

Filologiya Elmləri Doktoru, prof. Oruc İbrahimoğluTürksevər (Musayev)
Doctor of Philology, Prof. Oruj Ibrahimoglu Turksever (Musayev)

**Filologiya Elmləri Doktoru, prof. Oruc İbrahimoğluTürksevər (Musayev)**

Oruc İbrahimoğlu Türksevər (Musayev) 1929-cu ildə Azərbaycan Respublikasının Şəmkir rayonunda anadan olmuşdur. 1948-ci ildə orta təhsilini bitirmiş, 1949-cu ildə Azərbaycan Dövlət Pedaqoji Xarici Dillər İnstitutunun ingilis dili fakültəsinə daxil olmuş və 1953-cü ildə həmin institutu fərqlənmə diplomu ilə bitirmişdir. 1957-ci ildə Bakı Dövlət Universitetinin filologiya fakültəsinə daxil olmuş və 1964-cü ildə həmin universiteti bitirərək ikinci ali təhsil almışdır. 1961-ci ildə namizədlik dissertasiyası müdafiə etmiş və filologiya elmləri namizədi alimlik dərəcəsinə layiq görülmüşdür. 1985-ci ildə professor rütbəsi, 1998-ci ildə isə filologiya elmləri doktoru alimlik dərəcəsi almışdır.

Oruc İbrahimoğlu Türksevər 1960-cı illərin əvvəllərindən Azərbaycanca-İngiliscə lüğət tərtib etməyə başlamış, sonralar bu işə daha bir neçə mütəxəssis cəlb etmiş, 20 ildən artıq bir müddət ərzində adıçəkilən lüğət üzərində çalışmış və nəticədə Azərbaycan leksikoqrafiyası tarixində ilk dəfə olaraq irihəcmli və fundamental Azərbaycanca–İngiliscə lüğəti ərsəyə gətirmişdir. Həmin lüğət ilk dəfə 1996-cı ildə Kiril əlifbası ilə 1998-ci ildə isə təkmilləşdirilmiş şəkildə latın qrafikasında nəşr edilmişdir. Hazırda bu lüğət nəinki Azərbaycanda, hətta dünyanın bir çox ölkələrində - ABŞ-da, İngiltərədə, Kanadada və s. ölkələrdə yayılmışdır.

1993-cü ildə O.İ.Türksevər ingilis dilini öyrənənlərin, tərcüməçilərin ehtiyacını nəzərə alaraq İngiliscə-Azərbaycanca lüğətin tərtibinə başlamışdır. Sonralar həmin lüğətin tərtibinə daha bir neçə mütəxəssis cəlb etməklə, uzun və çox ağır zəhmət bahasına bu lüğətin ərsəyə gəlməsinə nail olmuşdur. Bu lüğət də öz tərtibi prinsipi və həcmi baxımından Azərbaycan leksikoqrafiyası tarixində ilk və orijinal lüğətdir.

50 ildən artıqdır ki, O.İ.Türksevər Azərbaycanda ingilis dilini tədris edir. Bu müddətdə o, ingilis və Azərbaycan dillərinin qrammatik quruluşunu və leksik tərkibini müqayisəli şəkildə tədqiq etməklə məşğul olmuşdur. Bu müddət ərzində o, bu sahədə bir sıra məqalə, monoqrafiya yazmış, ingilis dili üzrə seriya dərsliklər və dərs vəsaitləri nəşr etdirmiş, «Azərbaycanca–İngiliscə lüğət» və «İngiliscə-Azərbaycanca lüğət» tərtib etmişdir.



**Doctor of Philology, Prof. Oruj Ibrahimoglu Turksever (Musayev)**

Oruj Ibrahimoglu Turksever (Musayev) was born in 1929 in the Shamkir region of the Republic of Azerbaijan, finished high school in 1948 and entered the English department of the Azerbaijan State Pedagogical Institute of Foreign Languages and graduated from the said institute in 1953 with honours diploma. In 1957 he entered the philological department of the Baki State University and graduated from the said university in 1964 and received the second higher education. In 1961 he defended his dissertation and was given the scientific degree of Candidate of Philology. In 1985 he got the title of Professor. In 1998 he was conferred on the scientific degree of Doctor of Philology.

It is more than fifty years that Prof. Oruj Ibrahimoglu Turksever has been teaching English at the Institute of Foreign Languages, lately renamed Azerbaijan University of Languages and has been studying the grammatical structure and lexical system of English and Azerbaijani Turkish comparatively. During these years Prof. Oruj Ibrahimoglu Turksever has written a lot of scientific articles, a monograph and compiled a series of English text-books and teaching aids for high and higher schools; under his guidance and editorship an Azerbaijani-English dictionary was compiled, the first in the history of Azerbaijan lexicography. Nowadays the said dictionary is used in many countries of the world, such as the United States, Canada, England and others.

In 1993 Oruj Ibrahimoglu Turksever started to compile an English-Azerbaijani Dictionary. Lately he drew in some other specialists of English. This work has been going on for more than ten years and as the result of many restless days, sleepless nights and an ocean of toil the English–Azerbaijani Dictionary was brought into the world, the first and fundamental in the history of Azerbaijani lexicography.


**Bu lüğətin çapı**

**ExxonMobil**

Ekson Azərbaycan Əməliyyat Şirkəti, MMM
EksonMobilin törəmə şirkəti

**tərəfindən maliyyələşdirilmişdir**





**Printing of this dictionary was made possible by a contribution from**

**ExxonMobil**

Exxon Azerbaijan Operating Company LLC, an ExxonMobil Subsidiary

# English-Azerbaijani Dictionary

A – Z

Dictionary contains about 130.000 words, phrases and sentences.

**The dictionary was compiled on the initiative and under the guidance of Doctor of Philology,**
prof. **Oruj Ibrahimoglu Turksever (Musayev).**



Printing House «QISMƏT»
**Baki – 2003**

# İngiliscə-Azərbaycanca Lüğət

A – Z

Lüğətə təxminən 130.000 söz, söz birləşməsi və cümlə daxil edilmişdir.

**Lüğət filologiya elmləri doktoru,
prof. Oruc İbrahimoğlu Türksevərin (Musayevin)
təşəbbüsü ilə və rəhbərliyi altında tərtib edilmişdir.**



«QISMƏT» NƏŞRİYYAT POLİQRAFİYA
**Bakı – 2003**

**M-84** Tərtibçilər

Filologiya elmləri doktoru, prof. **O.İ. Turksevər (Musayev)**
f.e.n **P.O.Musayev**, f.e.n., dos. **M.M. Nurəddinov**
f.e.n. dos. **M.I.Paşayeva**, baş müəllim **N.Q.Səfərov**
baş müəllim **T.I.Əliyev**, baş müəllim **V.S.Ərəbov**
ingilis dili müəllimi **N.Ə.Nəbiyeva**

Baş redaktor
filologiya elmləri doktoru, prof. **O.İ.Türksevər (Musayev)**

Redaktor
**Q.Q. Məmmədov**

Bədii və texniki redaktor
**X.Öztürk**

Dizayner
**M.Məmmədrzayev**

Korrektorlar
**Q.M. Əsədova, F.B.Abdullayeva, X.Y.Əsgərova**

**M-84, İngiliscə–Azərbaycanca lüğət** *(lüğət)*, **"Qismət"** nəşriyyatı, Bakı, 2003. 1696 səh.

*Bütün hüquqlar*
*f.e.d. professor O.İ. Turksevərdə (Musayevdə)saxlanılır. Onun yazılı surətdə icazəsi olmadan həmin lüğətin nə bütövlükdə, nə də hər hansı bir şəkildə çap edilməsi, surətinin çıxarılması qəti qadağandır.*

© "Qismət", 2003.



**M-84** Compilers

Doctor of Philology, prof. **O.I. Turksever (Musayev)**
Candidate of Philology **P.O.Musayev**
Candidate of Philology, Assistant Prof. **M.M. Nuraddinov**
Candidate of Philology, Assistant Prof. **M.Pashayeva**
Head teacher **N.Q.Safarov**, Head teacher **T.I.Aliyev**
Head teacher **V.S.Arabov**, English teacher **N.A. Nabiyeva**

Editor-in-chief
Doctor of Philology, prof. **O.I. Turksever (Musayev)**

Editor
**G.G.Mammadov**

Tech. Editor
**H.Ozturk**

Desingner
**M.Mammadrzaev**

Proof readers
**Q.M.Asadova, F.B.Abdullayeva, Kh.Y.Askarova**

**M-84, English-Azerbaijani Dictionary** *(Dictionary)*, **"Qismət"** Publishing House, Baki, 2003. 1696 pp.

*All rights reserved.*
*This dictionary may not be printed, reproduced or transmitted in any form or by any means electronic or technical, including photocopying without the prior permission in writing of the Doctor of Philology, prof.* ***O.I. Turksever (Musayev).***

© "Qismət", 2003.



# ÖN SÖZ

Lüğət tərtib etmək çox çətin və ağır zəhmət tələb edən bir yaradıcılıq, demək olar ki, bir zərgərlik işidir. Məşhur alman dilçisi Qotfrid vaxtilə demişdir:

"Duae res longe sunt difficillimae – lexicon scribere et grammaticam" (İki iş xüsusilə çətindir – lüğət tərtib etmək və qrammatika yazmaq).

Lüğət tərib etmək çətin olduğu kimi, həm də çox məsuliyyətli və şərəfli bir işdir. Məsuliyyətlidir ona görə ki, o, minlərlə oxucunun istifadə edəcəyi mənbədir. Burada yol verilən hər hansı bir yanlışlıq, qeyri-dəqiqlik və nəhayət səhv minlərlə oxucunu çaşdırmaq deməkdir. Buna görə də lüğət, mümkün qədər dəqiq olmalıdır; şərəflidir ona görə ki, lüğət onun tərtibçisini əsrlərlə yaşadır, ona şöhrət və şərəf bəxş edir.

Lüğət tərtibi ilə məşğul olan adam, geniş elmi biliyə, polad iradəyə, tükənməz səbrə və nəhayət kamil peşə hazırlığına malik olmalıdır. Bu və bu kimi keyfiyyətlərə malik olmayan adam oxucunun ehtiyacını təmin edə biləcək kamil, etibarlı lüğət tərtib edə bilməz.

Oxucuların istifadəsinə təqdim edilən bu irihəcmli **İngiliscə-Azərbaycan lüğət** Azərbaycan leksikoqrafiyasında ilk addım, ilk təcrübədir. Buna görə də bu lüğətin tərtibi xeyli çətinlik törətmişdir. Onun tərtibi bir də ona görə çətin və ağır olmuşdur ki, indiyə kimi bu sahədə, yəni ingiliscə-Azərbaycanca lüğət tərtib etmək sahəsində respublikamızda nəzərə çarpacaq elə bir praktik təcrübə qazanılmamışdır. Həmin lüğət istər tərtibi prinsipi, istər həcmi, istərsə də əhatəliliyi baxımından leksikoqrafiya tariximizdə ilk təşəbbüsdür.

Həmin lüğətin işıq üzü görməsində f.e.d., prof. Oruc İbrahimoğlu Türksevərin xüsusi əməyi olmuşdur. O, nəinki lüğətin yazılması təşəbbüsünü irəli sürmüş, onun tərtibi prinsiplərini hazırlamış, lüğətin tərtibi işinə rəhbərlik etmiş, onun yarısından çoxunu bilavasitə özü tərtib etmiş, redaktədən əvvəlki mərhələdə lüğəti dəfələrlə başdan-başa oxumuş, onu ümumi məxrəcə gətirmiş, bəzi hallarda çətin sözlərin lüğətini özü yenidən tərtib etmiş, redaktədən və korrekturadan sonrakı düzəlişləri bilavasitə kompyuterdə özü düzəltmişdir. Lüğətlə bağlı olan təşkilatı məsələlərin həlli də Oruc müəllimin üzərinə düşmüşdür: o, sponsor tapmış və bu prosesdə qarşıya çıxan məsələləri həll etmişdir.

## GİRİŞ

Vətənimizdə yüz ilə yaxın bir müddətdə ingilis dilinin öyrənilməsinə və onun, xüsusən İkinci Cahan Müharibəsindən sonra, əsas xarici dil kimi öyrənilməsinə, tədris olunmasına baxmayaraq, indiyə qədər bu həcmdə və bu prinsip əsasında tərtib edilmiş İngiliscə-Azərbaycanca lüğət mövcud deyil. Belə çox böyük zəhmət və məsuliyyət tələb edən işi indiyə qədər heç kim boynuna götürməmiş və ya götürməyə cəsarət etməmişdir. Çox böyük milli-siyasi, tədris-mədəni əhəmiyyət kəsb edən bu missiya filologiya elmləri doktoru, professor Oruc İbrahim oğlu Türksevərin (Musayevin) və onun rəhbərliyi altında fəaliyyət göstərən bir qrup mütəxəssisin üzərinə düşmüşdür. Beləliklə, tam məsuliyyətlə qeyd etmək olar ki, həmin lüğət Azərbaycan leksikoqrafiya tarixində ilk təcrübədir.

Lüğətin hazırlanmasına Azərbaycanda fəaliyyət göstərən Ekson Azərbaycan Əməliyyat Şirkətinin (MMM) sifarişi ilə 1993-cı ildə başlanmış və onun tərtibinə aramsız olaraq 10 il vaxt sərf edilmişdir.

**A, B, C, D, I, J, K, P, R, S, V, U** hərfləri ilə başlanan sözlərin lüğətini f.e.d., prof. O.İ. Türksevər (Musayev); **E, F** hərfləri ilə başlanan sözlərin lüğətini baş müəllim T.İ.Əliyev, **G, H, Q** hərfləri ilə başlanan sözlərin lüğətini baş müəllim N.Q.Səfərov; **L, M** hərfləri ilə başlanan sözlərin lüğətini baş müəllim V.S.Ərəbov, **O, N** hərfi ilə başlanan sözlərin lüğətini f.e.n. P.O. Musayev; **T** hərfi ilə başlanan sözlərin lüğətini f.e.n, dos. M.M.Nurəddinov, **W, X, Y, Z** hərfləri ilə başlanan sözlərin lüğətini isə f.e.n., dos. M.M.Paşayeva tərtib etmişdir. Lüğətin "Əlavə" hissəsini **(I şəxs adları, II coğrafi adlar, III ingilis dilində ən çox işlənən ixtisarlar, IV qaydasız fellər, V pul vahidləri)** ingilis dili müəllimi N.Ə.Nəbiyeva tərtib etmişdir.

Geniş oxucu kütləsinin sərəncamına təqdim edilən bu lüğətdən ingilis dilini öyrənən hər bir kəs – orta məktəb şagirdləri, ali məktəb tələbələri, aspirantlar, ingilis dili müəllimləri, tərcüməçilər, habelə ingilis dilini müstəqil öyrənmək istəyən hər bir şəxs, habelə Azərbaycan türkcəsi ilə maraqlanan hər bir ingilis dilli əcnəbi istifadə edib, bol-bol bəhrələnə bilər.

Bu lüğət taleyin amansız hökmü ilə vətənindən ayrı düşmüş və dünyanın müxtəlif ölkələrində yaşayan milyonlarla Azərbaycan türkü və habelə digər həmvətənlərimiz üçün də çox faydalı ola bilər.

Baş redaktor, f.e.d., prof. O.İ. Türksevər (Musayev) lüğətin daha kamil və əhatəli olması üçün verdikləri faydalı məsləhətlərinə görə f.e.n., prof. S.M.Babayevə, baş müəllim Q.Q.Məmmədova, f.e.n. P.O.Musayevə, f.e.n. F.B.Abdullayevaya, ingilis dili müəllimi Q.M.Əsədovaya öz təşəkkürünü bildir. O, həmçinin, lüğətin kompyuterdə yığılması və formatlaşdırılmasında xüsusi zəhmət çəkmiş f.e.n. P.O.Musayevə, ADU-nun Kompyuter laboratoriyasının müdiri A.H. Novruzova və həmin laboratoriyanın işçiləri X.Y.Əsgərovaya, S.Ə.Əsgərovaya, həmçinin lüğətin çapına göstərdiyi qayğı üçün **"Qismət"** Nəşriyyat-Poliqrafiya və Ticarət LTD şirkətinin baş direktoru Z.Məmmədrzayevə dərin minnətdarlığını bildirir. Habelə, baş redaktor və tərtibçilər həmin lüğətin çap olunmasına sponsorluq etmiş **Exxon** Azərbaycan Əməliyyat şirkətinin rəhbərliyinə və əməkdaşlarına, xüsusən həmin şirkətin Baş Meneceri cənab Dru R. Qudbredə öz dərin minnətdarlığını bildirirlər.

Həmin lüğətin işıq üzü görməsində göstərdiyi təmənnasız kömək üçün lüğətin baş redaktoru və eləcə də tərtibçilər **Azerbaijan International** jurnalının təsisçisi Betty Blair xanıma təşəkkür edirlər.

Yuxarıda qeyd edildiyi kimi, həmin lüğət istər tərtibi prinsipləri və istərsə də həcmi baxımından leksikoqrafiya tariximizdə ilk addımdır, təcrübədir. Buna görə də, ehtimal ki, qüsurlardan xali olmayacaq. Lüğətdə gözə çarpan qüsurlar barədə fikir söyləyəcək mütəxəssislərə, eləcə də hər bir oxucuya lüğətin baş redaktoru f.e.d. prof. O.İ. Türksevər (Musayev) və eləcə də tərtibçilər bəri başdan öz minnətdarlıqlarını bildirirlər.

Filologiya elmləri doktoru,
**prof. O.İ. Türksevər (Musayev)**

## LÜĞƏTİN TƏRTİBİ PRİNSİPLƏRİ

**1.** Morfoloji quruluşundan asılı olmayaraq, yəni sadə, düzəltmə yaxud mürəkkəb olmasına baxmayaraq müasir ingilis dilinə xas olan sözlər həmin lüğətə baş söz kimi daxil edilmişdir. Bu, digər sözlə o deməkdir ki, ingilis dilində mövcud olan **book, table, pen, ten, window** və s. sadə sözlər, **beautiful, writer, friendship, wisdom, darkness** və s. düzəltmə sözlər, eləcə də **headache, handkerchief, nutshell, manmade, handbreak** və s. kimi mürəkkəb sözlər də həmin lüğətə baş söz olaraq daxil edilir.

**2.** Müasir ingilis dilində elə sözlər var ki, onlar eyni morfoloji formada müxtəlif distribusiyaya malik olur. Digər sözlə bu qəbildən olan sözlər morfoloji şəkillərini hifz edərək müxtəlif nitq hissəsi funksiyasında işlənə bilir. Belə sözlərə misal olaraq **home, cold, that, like, still, stay, row, level, dirty, dark, dance, bribe** və s. sözləri göstərmək olar. Bu sözlərdən hər biri nitqdə ən azı iki distribusiyaya malikdir. Məsələn, **home** sözü eyni morfoloji formada iki funksiyada – həm isim, həm də sifət funksiyasında işlənə bilir; 1) isim funksiyasında: to come **home;** 2) sifət funksiyasında: **home** address; **cold** sözü eyni morfoloji formada həm **isim,** həm **sifət**, həm də **zərf** funksiyasında işlənə bilir: 1) isim funksiyasında: **Don't go for a walk in the cold;** 2) sifət funksiyasında: **a cold day;** 3) zərf funksiyasında: **When he asked her to marry him, she refused him cold.**

Yaxud **that** sözünü götürək. Bu söz bir halda işarə əvəzliyi, **(That is a book),** digər halda nisbi əvəzlik **(The book that I bought yesterday is very readable),** üçüncü halda bağlayıcı funksiyasında **(I know that she will come)** işlənə bilir.

Bu qəbildən olan sözlərdən eləsinə də təsadüf etmək mümkündür ki, onlar nitqdə daha çox distribusiyaya malik olur. Məsələn, **like** sözünün 6 distribusiyaya malik olduğunu demək lazım gəlir: **like$^1$** *(isim)*, **like$^2$** *(sifət)*, **like$^3$** *(fel)*, **like$^4$** *(zərf)*, **like$^5$** *(sözönü)*, **like$^6$** *(bağlayıcı)*. Bax: *(Longman Dictionary of Contemporary English*, səh. 634-635).

Bu qəbildən olan ingilis dili sözləri həmin lüğətə onların distribusiyasına müvafiq olaraq müxtəlif nitq hissəsi kimi daxil edilmişdir, onların hər biri qarşısında onun hansı nitq hissəsi funksiyasında işlənməsi göstərilmiş və üstünə qoyulmuş ərəb rəqəmi ilə sıralanmışdır. Məsələn, **cold$^1$** *n*, **cold$^2$** *adj*, **cold$^3$** *adv.*

**3.** Lüğətə daxil edilmiş hər bir baş sözdən sonra onun morfoloji xarakteristikası verilmişdir, yəni lüğətə daxil edilmiş baş sözlərin hansı nitq hissəsinə aid olması da göstərilir. Məsələn, **hand** *n*, **quick** *adj*., **quickly** *adv*., **and** *conj*., **on** *prep*. və s.

**4.** Eyni morfoloji formada müxtəlif distribusiyaya malik olan sözlərin düzülüşü müəyyən bir prinsipə tabe edilmişdir. Burada həmişə əvvəlcə **isim**, sonra **sifət**, sonra **əvəzlik**, bundan sonra **fel**, daha sonra isə **zərf** verilir. Əgər hər hansı bir söz həm əsas, həm də köməkçi nitq hissəsi funksiyasında işlənə bilirsə, belə halda əvvəlcə həmin sözün əsas nitq hissəsi kimi işlənən variantı və ya variantları, sonra isə onun köməkçi nitq hissəsi kimi işlənən variantı və ya variantları verilmişdir. Buna misal olaraq **before** sözünü göstərmək olar. Bu söz öz morfoloji formasını dəyişmədən həm əsas nitq hissəsi, daha dəqiq desək **zərf**, həm də köməkçi nitq hissəsi - **sözönü** və **bağlayıcı** kimi işlənə bilir. Lüğətdə **before** sözü əvvəlcə əsas nitq hissəsi, yəni **zərf** kimi, sonra isə köməkçi nitq hissəsi kimi, yəni **sözönü** və **bağlayıcı** kimi verilmişdir. Lüğətdə sözlərin bu tərzdə yerləşdirilməsi təsadüfi olmayıb, nitq hissələrinin ənənəvi təsnifatına əsaslanır.

**5.** Müasir ingilis dilində sözlərin yazılışı ənənəvi-tarixi prinsipə əsaslanır. Bunun da sayəsində sözlərin hərf tərkibi ilə səs tərkibi arasında ciddi fərqlər mövcuddur. Digər tərəfdən də ingilis dilinə xas olan saitlər söz tərkibindəki yerindən asılı olaraq müxtəlif cür oxunur və s. Müasir ingilis dilinə xas olan bu və bu kimi xüsusiyyətlər bu dildə sözlərin oxunuşunu xeyli çətinləşdirir. Məhz buna görə də ingilis dili lüğətlərində hər bir sözün qarşısında ənənəvi olaraq onun oxunuşu, transkripsiyası verilmişdir. Bu ənənəyə sadiq qalaraq həmin lüğətdə də hər bir sözün qarşısında transkripsiya işarəsi ilə onun tələffüzü verilir. Bu işdə İngiltərədə qəbul edilmiş beynəlxalq transkripsiya işarələrindən istifadə edilmişdir (Bax: səh. XXII).



**6.** Vurğu ingilis dili sözlərinə xas olan əsas xüsusiyyətlərdən biridir. O, sözün daxilindəki saitlərin, bununla əlaqədar olaraq da sözlərin oxunuşuna ciddi təsir göstərir, bəzən isə onların (sözlərin) qrammatik və nominativ mənasını dəyişdirir. Buna misal olaraq **present** sözünü göstərmək olar: əgər vurğu həmin sözün birinci hecası üzərinə düşərsə (['prezənt]), o, isim olur və **hədiyyə** mənası kəsb edir; vurğu həmin sözün ikinci hecasına düşərsə ([prı'zent]), o, fel olur və **hədiyyə vermək** mənasına malik olur. Yaxud ingilis dilində olan saitlər vurğunun sözdəki yerindən asılı olaraq müxtəlif cür oxunur, müxtəlif səslər ifadə edir. Buna misal olaraq **a, i** və s. sait hərflərini göstərmək olar. Məsələn, **a** hərfi vurğulu qapalı hecada [æ], - **map** [mæp], vurğulu açıq hecada [eı], - **page** [peıdʒ], vurğusuz hecada [ə] oxunur - **assistance** [ə'sıstəns]; **i** hərfi vurğulu qapalı hecada [ı] - **pin** [pin], vurğulu açıq hecada [aı] - **five** [faıv] oxunur və s. Müasir ingilis dilində vurğunun belə ciddi əhəmiyyət kəsb etməsini nəzərə alaraq həmin lüğətə daxil edilmiş iki və daha çox hecaya malik olan bütün baş sözlərin üzərinə vurğu işarəsi qoyulur.

**7.** Müasir ingilis dilində iki növ vurğu işlədilir: 1) birinci dərəcəli vurğu (primary stress); 2) ikinci dərəcəli vurğu (secondary stress). Bunların nitqdəki əhəmiyyətinə uyğun olaraq birinci dərəcəli vurğu hecanın üstündə yuxarıdan, ikinci dərəcəli vurğu isə hecanın altında aşağıdan qoyulur. Məsələn, **memory** ['memərı], **definition** [ˌdefi'nıʃn], **antimatter** ['æntıˌmætəʳ] və s.

**8.** Həmin lüğətə gündəlik işlənən ümumi sözlərlə yanaşı, bir sıra elm sahəsində işlənən terminlər də daxil edilmişdir. Bu halda hər bir termindən sonra onun hansı elm sahəsinə aid olduğu da göstərilir. Məsələn, **daizy** sözü çiçək adıdır və təbiidir ki, o, botanikaya aiddir. Bunu göstərmək üçün həmin sözdən sonra qısa olaraq *bot*. yazılır. Bu o deməkdir ki, haqqında danışılan termin botanika elmində işlənir. Yaxud **dysentry** sözündən sonra *tib*. yazılmışdır. Bu isə o deməkdir ki, həmin termin tibb sahəsində işlənir və s. Lüğətə daxil edilmiş digər terminlər də bu tərzdə işarə edilmişdir. Elm sahələrinə aid olan terminlər haqqında işlədilən ixtisarların ayrıca siyahısı verilmişdir (Bax: səh. XIX-XX).

**9.** Həmin lüğətdə sinonim sözlərdən çox işlək olanı izah edilir, az işlək olanı izah edilmir. Onun qarşısında ona sinonim olan sözə baxmaq məsləhət görülür və bərabərlik işarəsi (=) ilə qeyd olunur. Məsələn, **admittance** və **admission** ingilis dilində sinonim kimi işlənən sözlərdir. Bunlardan birincisi daha geniş işlədilir, ona görə də bu sözlərdən birincisi (**admittance**) izah edilir, ikincisinin (**admission**) qarşısında bərabərlik işarəsi (=) qoyulur və **admittance** yazılır: **admission...** *n* **= admittance.**

**10.** Müasir ingilis dilində bəzən elə sözlərə təsadüf edilir ki, onlar eyni morfoloji formada, eyni nitq hissəsi kimi tamam başqa mənaya malik olur. Belə sözlər həmin lüğətə ayrı-ayrı baş söz kimi daxil edilmişdir. Onlar qarşısında rum rəqəmi qoymaqla

fərqləndirilir. Məsələn, **ball** bu qəbildən olan sözdür. Həmin söz bir halda **top,** digər halda **bal** *(ziyafət)* mənası kəsb edir. Hər iki halda bü söz isim olaraq işlənir. Bu söz lüğətdə belə verilmişdir: **ball** *n* I top, **ball** *n* II bal, ziyafət.

**11.** Müasir ingilis dilində işlənən sözlərin bir qismi dilimizdə bir deyil, bir neçə mənaya malik olur. Bu mənaların bir qismi bir-birinə yaxın, digər qismi isə uzaq olur. Eyni ingilis sözünə xas olan yaxın mənalar arasında vergül işarəsi, qismən uzaq mənalar arasında isə nöqtəli vergül işarəsi qoyulur və bu mənalar ərəb rəqəmi ilə sıralanır. Məsələn, **cynical** ['sɪnɪkəl] *adj* **1.** abırsız, utanmaz; **2.** ədəbsiz; **effect** [ɪ'fekt] *n* **1.** nəticə; **2.** məqsəd; **3.** təsir.

**12.** Bəzi ingilis sözlərini dilimizə tərcümə edərkən, onların müxtəlif mənalarını dəqiqləşdirmək üçün əlavə izahat vermək lazım gəlir. Bu növ izahatlar həmin sözdən ya əvvəl, ya da sonra mötərizədə verilir. Belə sözlərdən biri **corn** sözüdür. Bu söz lüğətdə belə verilir: **corn** [kɔ:n] *n* **1.** taxıl; dən; buğda *(xüs. İngiltərədə)*; **2.** *(Amerikada)* qarğıdalı; 3. dənə *(kofe / istiot dənəsi)*.

**13.** Bəzi hallarda eyni bir ismə aid bir neçə təyin işlənə bilir. Belə halda qənaət xatirinə baş söz tərcümədə təkrar edilmir; baş sözə aid olan təyinlər arasında drob işarəsi ( / ) qoyulur. Məsələn, **cynical behaviour** abırsız / ədəbsiz davranış.

**14.** İngilis dilində elə sözlər var ki, onlar ya ancaq təkdə **(singularia tantum)**, ya da ancaq cəmdə **(pluralia tantum)** işlənir. Ancaq təkdə işlənən isimlərin qarşısında *sing.*, ancaq cəmdə işlənən isimlərin qarşısında *pl.* yazılır. Məsələn: **information** *sing.*, **tongs** *pl.*

**15.** Lüğətə daxil edilmiş baş sözlərlə yanaşı, həmin baş sözlə işlənə biləcək sərbəst və qeyri-sərbəst söz birləşmələri də verilmişdir. Bu halda yenə qənaət xatirinə söz birləşmələrində baş söz əvəzinə tilda işarəsindən (~) istifadə edilmişdir. Məsələn, **to drag** sözü ilə əlaqədar olaraq verilən söz birləşməsi lüğətə bu şəkildə daxil edilmişdir: **to ~ *one's* feet ayaqlarını sürümək**, yəni həmin söz birləşməsində **to drag** feli əvəzinə ancaq **to** yazılmış, sonra isə **drag** sözü əvəzinə tilda işarəsi (~) qoyulmuşdur.

**16.** Lüğətə müasir ingilis dilində işlənməkdə olan frazeoloji birləşmələr — zərbi-məsəllər, atalar sözləri də daxil edilmişdir. Bu da məlumdur ki, bir dildən digərinə tərcümə məqamında, eləcə də ikidilli lüğətlərin tərtibi işində çətin məsələlərdən biri də bu qəbildən olan dil vahidlərinin ekvivalentlərinin tapılmasından ibarətdir. Bu lüğətin tərtibi işində biz də həmin çətinliklərlə qarşılaşdıq. Bu problemi biz iki yolla həll etməyə çalışmışıq: 1) müasir ingilis dilində işlənən zərbi-məsəllərin və atalar sözlərinin ana dilimizdə ekvivalentini tapmaq yolu ilə. Məsələn, **to fish in troubled waters** - *bulanıq suda balıq tutmaq*; **A friend in need is a friend indeed** - *Yaxşı dost yaman gündə tanınar;* 2) müasir ingilis dilində işlənən zərbi-məsəlləri və atalar sözlərini kalka etmək yolu ilə. Məsələn, **If you sell your cow, you sell your milk, too.** - *Əgər inəyini satırsansa, demək südünü də satırsan*; yaxud **There is no rule without exception** - *İstisnasız qayda yoxdur.*

**17.** İngilis dili felləri keçmiş zaman qeyri-müəyyən və feli sifət II formalarının düzəldilməsi baxımından iki qrupa bölünür: qaydalı fellər ***(regular verbs)*** və qaydasız fellər ***(irregular verbs).*** Qaydalı fellərin keçmiş zaman qeyri-müəyyən forması müəyyən qaydaya əsasən, daha doğrusu felin sonuna **-ed** şəkilçisi əlavə etməklə düzəldilir, qaydasız fellərin eyniadlı formaları müxtəlif yollarla düzəldilir. Burada müəyyən qaydaya riayət edilmir. Buna görə də ingilis dilinə xas olan qaydasız fellərin keçmiş qeyri-müəyyən zaman formasını və feli sifət II şəklini ayrıca leksem kimi öyrənib yadda saxlamaq lazım gəlir. Məsələnin bu cəhətini nəzərə alaraq həmin lüğətdə müasir ingilis dilinə xas olan qaydasız fellərin özləri ilə yanaşı onların keçmiş zaman qeyri-müəyyən forması və feli sifət II forması da verilmişdir. Bu formalar lüğətə baş söz kimi daxil edilmiş qaydasız fellərdən sonra mötərizədə verilir. Mötərizədə birinci həmin felin keçmiş zaman qeyri-müəyyən forması, sonra isə feli sifət II forması verilir. Məsələn, **write** [raɪt] *v* *(pt* **wrote** [rout], *pp* **written** ['ritn]).



**18.** Bəzi ingilis sözləri yazıda həmin sözün amerikan variantından fərqlənir. Bü qəbildən olan sözlərin hər iki variantı həmin lüğətə baş söz olaraq daxil edilir. Onların ingilis variantı lüğətdə adi söz kimi izah edilir, amerikan variantı isə izah edilmir. Söz lüğətə daxil edilir, onun qarşısında *amer.*, yəni amerikan variantı yazılır, sonra bərabərlik işarəsi qoyulur, daha sonra isə həmin sözün ingilis variantı verilir. Məsələn:

**center** ['sentə$^r$] *n amer.* = **centre**

**color** ['kʌlə$^r$] *n amer.* = **colour**

**19.** Müasir ingilis dilində bəzi sifətlərin müqayisə və üstünlük dərəcə formalarının düzəldilməsində çətinlik mövcuddur: ya son samit dəyişir, ya da qoşalaşır. Məsələn: **easy** – **easier** – **easiest** ; big – **bigger** – **biggest**. Bununla əlaqədar olaraq, həmin lüğətdə sifətlərin son hecası mötərizədə verilir, sözün kökü əvəzinə defis işarəsi qoyulur və sonra onların morfoloji forması göstərilir. Məsələn: **easy** və **big** sifətlərinin dərəcə formaları lüğətdə aşağıdakı kimi verilir:

**easy** ['i:zɪ] *adj* **(-ier, - iest)**

**big** [bɪg] *adj* **(- gger, - ggest)**

**20 .** Müasir ingilis dilində bir sıra fellərin **pt, pp,** və **pr.p** formalarını düzəldərkən son samit qoşalaşır. İngilis dili felinə xas olan bu xüsusiyyət həmin lüğətdə belə işarə edilir: baş söz kimi verilmiş felin transkripsiyasından sonra mötərizədə qoşalaşan samit göstərilir. Məsələn:

**permit** [pə'mɪt] *v* (**- tt -**)

**21.** Müasir ingilis dilində mövcud olan **you** şəxs əvəzliyi və **your** yiyəlik əvəzliyi Azərbaycan türkcəsinə iki cür tərcümə edilir: **you** – sən, siz; **your** – sənin, sizin. Bu tərcümə variantlarının hansının seçilməsi həmin əvəzliklərin işləndiyi kontekstdən asılı olur. Məlumdur ki, lüğətdə kontekst olmur. Bununla belə, iki dil (ingilis dili və Azərbaycan türkcəsi) arasında mövcud olan bu xüsusiyyəti həmin lüğətdə əks etdirmək vacibdir. Lüğətdə bu məsələ belə həll edilmişdir: **you** və **your** əvəzliklərinin işləndiyi hər bir məqamda onların dilimizə tərcümə edilə biləcək hər iki variantı verilir, bu variantlar arasında drob (/) işarəsi qoyulur. Məsələn:

*You must go home Sən / Siz evə getməlisən / getməlisiniz*

*Where's your father? Sənin/ Sizin atan / atanız haradadır?*

**22.** Müasir ingilis dilində, xüsusən onun amerikan variantında, bir sıra sözləri tələffüz edərkən [r] səsi eşidilir, lakin bu hal orfoqrafiyada özünü biruzə vermir. Bu qəbildən olan sözlərin axırında [r] səsinin tələffüz edilməli olduğunu göstərmək üçün həmin sözlərin transkripsiyasının sonunda yuxarıdan kiçik [*r*] işarəsi qoyulur, məsələn: **writer** ['raɪtə$^r$] , **sailor** ['seɪlə$^r$], **pour** [pɔ:$^r$], **nature** ['neɪtʃə$^r$], **labour** ['leɪbə$^r$], **car** [ka:$^r$], **pair** [peə$^r$] və s.

Filologiya elmləri doktoru,

prof. **O.İ. Türksevər (Musayev)**

## LÜĞƏTDƏ İSTİFADƏ EDİLMİŞ ŞƏRTİ İŞARƏLƏR VƏ ONLARIN MƏNASI

1. ~ *(tilda)* işarəsi. Bu işarə baş sözün əvəzində işlədilir. Məs.:
   **keen knife = ~ knife**
   **musical comedy = ~ comedy**
   **to cover *one's* head = to ~ *one's* head**
   **to demand insistently = to demand ~**

◊ *(romb)* işarəsi. Bu işarə altında frazeoloji birləşmələr – atalar sözü və zərbi-məsəllər verilir. Məs.:
   *God sends a curst cow short horns.*
   *Who keeps company with the wolf will learn to howl.*

≅ *(təxminilik)* işarəsi. Bu işarə mənası təxmini olaraq verilən atalar sözləri, zərbi-məsəllər və ya digər birləşmələrdən sonra qoyulur. Məs.:
   **to take counsel of *one's* pillow** ≅ *Axşamın xeyrindən, səhərin şəri yaxşıdır; Knives are out* ≅ *Xəncər çıxdı, qan çıxdı; When the cat's away, the mice will play Pişik olmayanda siçanlar bayram edər,* ≅ *Dərə xəlvət, tülkü bəy.*

/ *(çəpəki)* xətt işarəsi. Bu işarə üç halda işlədilir:
   hər iki dildə mənaca bir-birinə yaxın olan, bir-birini əvəz edə biləcək sözlər arasında. Məs.:
   ingiliscə: **to ask/to inquire**
   Azərbaycan türkcəsində: **ötən/keçən**
   hər iki dildə eyni fel işlənə bilən isimlərin arasında:
   ingiliscə: to read **a book/a newspaper/a letter/a story** *etc.*
   Azərbaycan türkcəsində: **kitab/məktub/hekayə/qəzet** *və s.* oxumaq.
   hər iki dildə eyni bir isimlə işlənə biləcək sifətlərin arasında:
   İngilis dilində: **progressive/religious/philosophical** views
   Azərbaycan türkcəsində: **mütərəqqi/elmi/fəlsəfi** baxışlar

5. İngilis dilində mövcud olan **you** şəxs və **your** yiyəlik əvəzliyi Azərbaycan türkcəsinə iki cür tərcümə edilir: **you – sən, siz; your – sənin, sizin**. Həmin lüğətdə bu əvəzliklərin hər iki mümkün variantı verildikdə onlar arasında drob (/) işarəsi qoyulmuşdur.



## PREFACE

The study and teaching of English as a foreign language has a long history and tradition in Azerbaijan; it's nearly a century that English has been studied and taught in high and higher educational institutions of Azerbaijan. But despite the fact, we haven't got a voluminous, complete and perfect English-Azerbaijani dictionary.

Compiling a dictionary is a highly skilled and highly professional task. Central to compiling a dictionary is the sensitive anticipation of the user's need; and then, of course, devising the best way of satisfying them. When the users are envisaged as predominantly those for whom English is a foreign language, the task becomes still more demanding.

Compiling a bilingual dictionary, such as English-Azerbaijani – is also a highly skilled and professional task. The task becomes still more difficult and painstaking when there's no national tradition in compiling a dictionary of the kind.

It can be definitely noted that when we started to compile this English-Azerbaijani Dictionary there was no national tradition in this field of Azerbaijani lexicography. We are the pioneers who made an attempt to compile a bilingual English-Azerbaijani Dictionary of the kind. So it's really the first major bilingual dictionary in the history of Azerbaijani lexicography. The project is the result of ten years of hard and painstaking labour under the guidance and general editorship of Doctor of Philology, prof. O.I.Musayev.

This dictionary is certainly, a great gift to English language learning and teaching in our republic. It, I'm sure, will help the learners of English to develop the receptive and productive skills, the ability to compose as well as to understand.

In preparing this bilingual English-Azerbaijani Dictionary we have used the achievements of contemporary English lexicography. We are extremely happy that we had at our disposal such dictionaries as "Longman Dictionary of Contemporary English", Oxford University Press, 1999, "Oxford Advanced Learner's Dictionary", printed in Great Britain at Pitman Press, Bath, 1978, E.A. M.Wilson. "The Modern Russian Dictionary for English Speakers", Pergamon Press.Oxford.New York.Toronto. Sidney.Paris. Frankfurt, 1982, Oxford Advanced Learner's Dictionary of Current English. G.S. Hornby. Two Volume edition. Oxford University Press, 1982, which helped us greatly to choose the entries for our dictionary and to compile the said dictionary successfully.

The dictionary of the words beginning with the letters **A, B, C, D, I, J, K, P, R, S, U, V** was compiled by Doctor of Phil., prof. O.I. Turksever (Musayev); **G, H, Q** by the Head teacher N.G.Safarov, **L, M** by Head teacher V.S. Arabov, **O, N** by Cand. of Phil. P.O.Musayev; **E, F** by the Head teacher T.İ.Aliyev; **T** by Cand. of Phil., Assistant Prof. M.M. Nuraddinov, **W, X, Y, Z** by Cand. of Phil., assistant prof. M.M. Pashayeva, **Appendix (I per-**

**sonal names, II geographical names, III abbreviations, IV irregular verbs, V monetary units)** was compiled by English teacher N.A.Nabiyeva.

The dictionary includes about 50000 entries, a lot of expressions of everyday life, different terms used in various fields of science, English proverbs and sayings.

After the collapse of the Soviet-Communist regime English has become the major means of international communication in Azerbaijan. So to learn and to master English Azerbaijanis need different English text-books, handbooks, training appliances, bilingual dictionaries and other training aids. This dictionary has been compiled to meet the greatest demand of Azerbaijani learners of English – teachers, pupils, students, translators, interpreters and anybody who wants to learn English.

This dictionary will also be extremely useful for Azerbaijani Turks who due to bitter fate are obliged to live abroad, in different countries of the world.

There's no doubt that this dictionary will have a profound effect on teaching and learning English in our Republic. With the help of this dictionary Azerbaijanis will have a good opportunity to learn and master English directly, avoiding Russian.

Printing this dictionary was made possible by a contribution from Exxon Azerbaijan Ltd. Editor-in-Chief Doctor of Phil., prof. O.I.Turksever (Musayev) expresses his heartfelt thanks to Drew R. Goodbread, General Manager, Exxon Azerbaijan Operating Company LLC for his assistance in the printing of this dictionary.

The Editor-in-Chief and the compilers of the said dictionary also express their deep and heartfelt gratitude to Betty Blair, executive editor of "Azerbaijan International", for her disinterested assistance in printing the said dictionary. It was Betty khanum Blair who favoured us to establish relations with Exxon-Azerbaijan Ltd. that made it possible to print the dictionary by making a contribution.

We wish to express our thanks to those who have contributed advice and suggestion to make the dictionary more perfect and complete, particularly to Cand. of Phil., Prof. S.M.Babayev, to Head teacher G.G..Mammadov, Cand. of Phil. P.O.Musayev, Cand. of Phil. F.B.Abdullayeva, English teacher G.M.Asadova.

Our thanks are also due to Cand. of Phil. P.O.Musayev, to A.H.Novruzov, the Head of Computer Centre of Azerbaijan University of Languages and to Kh.Y.Asgerova, S.A.Asgerova, the associates of the centre for their activity in type-setting and storing the said dictionary in computer.

As mentioned above, this project is the first experience in the history of Azerbaijan lexicography. So, undoubtedly, there may be some errors and misprints in the dictionary. We wish to express our heartfelt gratitude to any users in advance, who will call attention to the possible misprints and errors. The suggestions will be carefully considered in the next edition.

Doctor of Philology,
prof. **O.I. Turksever (Musayev)**



## Guide to the Use of the Dictionary

This dictionary tells you a lot about English words, terms used in different fields of science, word combinations, their different meanings, spellings and usage in coherent speech. It also tells you about the combinability of words in phrases and sentences. The dictionary also includes many English proverbs and sayings. It tells you about their equivalents in Contemporary Azerbaijani.

To use this dictionary properly you need to know how to find information included in it. It's easy to do this if you understand how the dictionary works. Taking this into account, we consider it necessary to note the following:

The entries in the dictionary are arranged in alphabetical order and are printed in bold type. Every entry begins with a headword and in all main entries this is followed by information on pronunciation and grammar and by one and more definitions. These explain the meaning or meanings of the headword and are accompanied in most cases by examples showing how the headword is used in context and in coherent speech. Different senses are separated by Arabic figures and are arranged according to traditional classification of parts of speech in English grammar, ie. first come nominal parts of speech, then verbs, adverbs, etc.

As it's generally known most English words have more than one meaning. These meanings can be close or distant. Close meanings are separated by comma, distant ones with semi collon, such as:

**caddish** ['kædɪʃ] *adj* kobud, ədəbsiz, nadan

**clot** [klɔt] *v* laxtalaşmaq; qatılaşmaq; ərp bağlamaq

Words which are formed from a simple word by the addition of a suffix are called derivatives and the derivatives are also given as headwords in the alphabetical order. Such as, **handful, kindness, friendship, beautiful, homeless, dictation, satisfaction, homeward**, *etc*. Words which are formed from two or more words functioning as a single unit are called compounds. They may be written as unbroken single words (*eg* **headache, birthplace**) or with a hyphen (*eg* **butter-fingers, dinner-time, sugar-cane**). In this dictionary compounds spelt with hyphens or without it, as separate words, are listed alphabetically too as an independent lingual unit.

The phrases formed with each headword are treated and explained in its nest, such as, **damage** zərər, ziyan, zədə; **brain** ~ beyin zədəsi; **to the ~ of *smth*.** bir şeyin ziyanına/zərərinə; **dispute** müzakirə, mübahisə; **heated** ~ qızğın mübahisə/müzakirə; **bitter** ~ kəskin mübahisə. As it's seen from the given examples, the headword in the phrase isn't repeated, instead of it the tilde sign (~) is used.

The dictionary gives help with certain forms of nouns, adjectives, verbs, especially when these are not what you might expect. These irregular forms are given near the beginning of the entries. These forms occur especially in nouns, adjectives, verbs:

**Nouns**:
**potato ...** (*pl* **-os**)
**workman ...** (*pl* **-men**)
**knife ...** (*pl* **knives**)
**foot ...** (*pl* **feet**)
**sheep ...** (*pl* **unchanged**)
**handful ...** (*pl* **-fuls**)
2) **Adjectives:**
**brave ...** (**-r, -st**) = **braver, bravest**

**busy ...** *(-ier, -iest)* = **busier, busiest**
**big ...** *(-ger, -gest)* = **bigger, biggest**
**bad ...** *(***worse, worst***)*

When a word can be spelt in more than one way, this is shown in the following way:

**dramatization , - sation ...**
**criticize, - cise ...**

British and American English words are sometimes spelt differently. It is shown in the following way:

**center ...** *amer.* = **centre**
**color ...** *amer.* = **colour**
Synonyms are shown as following:
**chub ...** = **chubby**
**choreograph ...** = **choreographer**
**admission ...** = **admittance**.

In contemporary English there exist words which are used in the function of different parts of speech, keeping their morphological forms. For ex. **class** *(n)*, **class** *(v)*, **hand** *(n)*, **hand** *(v)*; **like** *(n)*, **like** *(adj)*, **like** *(v)*, **like** *(adv)*, **like** *(conj)*, *etc*. These kind of words are listed in this dictionary as a separate lexicon, as a separate headword and distinguished by Arabic numerals. Such as: **cold**$^1$ *n*, **cold**$^2$ *adj*, **cold**$^3$ *adv*.

Some other words in current English are used in the function of the same part of speech, having the same morphological form, such as **ball.**

As a noun this word has two quite different senses: 1) **ball** – a round object used for kicking, hitting or throwing in games; 2) a formal party for dancing. Such type of words are differentiated by the Rome numerals, which are used immediately after the symbol showing the part of speech, eg. **ball ...** *n* **I** top; **ball ...** *n* **II** ziyafət.

As it's known, stress is of a particular importance. It's used in all languages, including English, to show which of the syllables must be pronounced stronger. In certain cases it changes the meaning of the word, as it's in the word **`present** *n a thing given to smb. as a gift;* **pre`sent** *v to give smth. to smb.*

Taking these facts and the tradition existing in compiling English dictionaries, we have supplied all the words included in this dictionary with stress, except one-syllable ones.

English is an analytical language. It means that English words have very few morphological forms to distinguish them as different parts of speech. To define them as a part of speech we supply them with different symbols, showing the type as a part of speech, eg **cabin ...** *n*, **cabin...** *v*, **catch...** *n*, **catch...** *v*, **city...** *n*, **city...** *adj*, **cleverness...** *n*, **foolish...** *adj*, *etc*.

Current English proverbs and sayings are given under the symbol a. English proverbs and sayings are rendered into Azerbaijani Turkish in two ways: **1**) by finding an approximate Azerbaijani equivalent of English proverbs or sayings, such as *A friend in need is a friend indeed Yaxşı dost yaman gündə tanınar*; **2**) by finding a model construction after English patterns, *eg. If you sell your cow, you sell your milk, too İnəyini satırsansa, südünü də satırsan.*

Besides everyday words and expressions this dictionary includes a lot of terms used in different fields of science. These terms are marked by abbreviations which are given separately in this dictionary in English, as well as in Azerbaijani Turkish (See pp. XIX-XX)

Doctor of Philology,
prof. **O.I. Turksever (Musayev)**



## SYMBOLS USED IN THIS DICTIONARY AND THEIR SENSE

As is in other dictionaries in this dictionary some symbols are used to denote a definite meaning. Here they are:

The symbol tilde (~) is used instead of the omitted word in a word combination e.g. the word combination **to handle carefully** is given in the dictionary in this way: **to handle** ~ i.e. instead of the adverb **carefully** the symbol ~ is used; or in the word combination **careful mother** instead of **careful** the symbol tilde (~) is used ~ **mother**. The symbol tilde (~) has the same function in other cases through the whole dictionary.

The symbol rhombus (◊) is used to show the phraseological units, *eg.:*

◊ *When the cat's away, the mice will play; to separate the sheep from the goat, etc.*

The symbol (≅) is used to show the approximateness of English proverbs' and sayings' translation into Azerbaijani Turkish, *eg.*:

to know a man by his company ≅ adamı dostuna görə tanımaq; to save *smth.* for a rainy day ≅ bir şeyi qara gün üçün saxlamaq

The symbol diagonal stroke (/) is used in the following cases:

between the words that are close in meaning and can be substitutes for each other in both languages, English and Azerbaijani Turkish, eg.:

**In English**: to ask/to inquire
**In Azerbaijani Turkish**: qaba/kobud; gözəl/qəşəng

between the nouns that can be used with the same verb in both languages:

**In English**: to read a letter/a novel/a story/a book, *etc.*
**In Azerbaijani Turkish**: məktub/roman/hekayə/kitab *və s.* oxumaq

between the adjectives that can be used with the same noun in both languages:

**In English**: progressive/scientific/religious/reactionary/philosophical views.
**In Azerbaijani Turkish**: mütərəqqi/elmi/dini/mürtəce/fəlsəfi baxışlar

The English personal pronoun **you** and the possessive pronoun **your** are translated into Azerbaijani Turkish in two ways: in the singular: **sən, sənin** and in the plural **siz, sizin**. To choose one of these variants depends upon the context; in some context **you** means **sən**, in another **siz**; in some context **your** means **sənin**, in another **sizin**. As there can't be any context in the dictionary, we have solved the problem in this way: the two possible translations of these pronouns are given and the symbol diagonal stroke (/) is used between, *eg.*:

Have **you** seen her today? – **Sən/Siz** onu bu gün görübsənmi/görübsünüzmü?; **Your** book is on the table – **Sənin/Szin** kitabın/kitabınız stolun üstündədir

## LÜĞƏTDƏ İSTİFADƏ OLUNMUŞ İXTİSARLAR
## AZƏRBAYCANCA - AZERBAIJANI

*amer.* amerikan variantı – American variant
*anat.* anatomiya termini – anatomical term
*antr.* antropologiya termini – anthropological term
*ara. söz.* ara söz – parenthesis
*arx.* arxaik söz – archaism
*arxeol.* arxeologiya termini – archaeological term
*astr.* astronomiya termini – astronomical term
*aşp.* aşpazlıq termini – cooking term
*at. söz.* atalar sözü – proverb
*av.* aviasiya termini – aeronautics term
*bağ.* bağlayıcı – conjunction
*bağç.* bağçılıq termini – horticultural term
*bakt.* bakteriologiya termini – bacteriological term
*bayt.* baytarlıq termini – veterinary term
*biol.* biologiya termini – biological term
*bot.* botanika termini – botanical term
*coğ.* coğrafiya termini – geographical term
*d.d.* danışıq dili – spoken language
*dəft.* dəftərxana termini – office term
*dən.* dənizçilik termini – nautical term
*dial.* dialekt sözü – dialect word
*dilç.* dilçilik termini – linguistic term
*din.* dini termin – term of religion
*dip.* diplomatiya termini – diplomatic term
*d.y.* dəmiryol termini – railway term
*ekol.* ekologiya termini – ecology term
*el.* elektrotexnika termini – electrical engineering term
*elm.* elmi termin – scientific term
*emf. var.* emfatik variant – emphatic variant
*etnoqr.* etnoqrafiya termini – ethnographic term
*evf.* evfimizm – euphemism
*əcz.* əczaçılıq termini – pharmacological term
*ədəb.* ədəbiyyatşünaslıq termini – term of literature
*əs.* əsatir – mythology
*fəls.* fəlsəfə termini – philosophical term
*fiz.* fizika termini – term of physics
*fiziol.* fiziologiya termini – physiological term
*folk.* folklor termini – folklore
*fon.* fonetik termin – phonetic term
*fot.* fotoqrafiya termini – term of photography
*fr.* fransız mənşəli söz – French
*geod.* geodeziya termini – term of geodesy
*geol.* geologiya termini – geological term
*hərb.* hərbi termin – military term
*hənd.* həndəsə – geometrical term
*hüq.* hüquqşünaslıq termini – term of law
*xüs.* xüsusən – especially
*id.* idman termini – sports term
*iqt.* iqtisadiyyat termini – term of economy
*idiom.* idiomatik ifadə – idiomatic expression
*in.* incəsənət termini – art term
*inc.* İncil – Bible
*inş.* inşaat termini – building term
*istehz.* istehza – irony
*jar.* jarqon – jargon
*kil.* kilsə termini – church term
*kim.* kimya termini – term of chemistry
*kin.* kinayəli – ironical
*kino* kino – movie
*kob.* kobud söz – rude word
*k.t.*. kənd təsərrüfatı termini – agricultural term
*qram.* qrammatika termini – grammatical term
*lat.* Latın dili – Latin
*mal.* maliyyə termini – term of finance
*mem.* memarlıq termini – term of architecture
*məc.* məcazi məna – figurative meaning
*mənt.* məntiq termini – logic term
*mət.* mətbəə termini – printing
*mətb.* mətbuat termini – term of press
*miner.* mineralogiya termini – term of mineralogy
*mus.* musiqi termini – term of music
*müh.* mühasibat termini – book-keeping term
*nəz.* nəzakət forması – polite
*opt.* optika – optics
*ovç.* ovçuluq termini – sporting term
*poliqr.* poliqrafiya termini – printing term
*psixol.* psixologiya termini – term of psychology
*rad.* radiotexnika termini – term of radio
*r.d.* rəsmi dil – official language
*rəs.* rəssamlıq termini – painting term
*riyaz.* riyaziyyat termini – term of mathematics
*s. bil. isimlərlə* sayıla bilən isimlərlə – with countable nouns
*sənətş.* sənətşünaslıq termini – art term
*siya.* siyasi termin – political term
*siya. iq.* siyasi-iqtisad termini – term of political economy
*şair.* şairanə söz – poetic word
*stat.* statistika termini – term of statistics
*şahm.* şahmat termini – chess term
*tab. s.* tabu söz *(ictimai yerdə işlənməsi yasaq edilən söz)* – taboo
*tar.* tarixi termin – term of history
*teatr.* teatrşünaslıq termini – theatrical term
*tex.* texnika termini – technical term
*tel.* televiziya – television
*tib.* tibb termini – medical term
*tic.* ticarət termini – term of commerce
*tik.* tikinti termini – term of building
*tipoqr.* tipoqrafiya termini – typographical term
*toxuc.* toxuculuq termini – textile term
*top. i* toplu isim – collective noun
*uşaq d.* uşaq dili – baby language
*vulq.* vulqar söz – vulgar word
*zaraf.* zarafatyana – jocular
*zərb. məs.* zərbi -məsəl – saying
*zool.* zoologiya termini – zoological ter



## ABBREVIATIONS USED IN THIS DICTIONARY
## İNGİLİSCƏ - ENGLISH

*adj* adjective – sifət
*adv* adverb – zərf
*conj* conjunction – bağlayıcı
*conj. pron* conjunctive pronoun – bağlayıcı əvəzlik
*demon. pron* demonstrative pronoun – işarə əvəzliyi
*emph. pron* emphatic pronoun – emfatik əvəzlik
*indef. adv* indefinite adverb – qeyri-müəyyən zərf
*indef. pron* indefinite pronoun – qeyri-müəyyən əvəzlik
*inter* interjection - nida
*interrog. adv* interrogative adverb – sual zərfi
*interrog. pron* interrogative pronoun – sual əvəzliyi
*n* noun – isim
*num* numeral – say
*part* particle – ədat
*pers. pron* personal pronoun – şəxs əvəzliyi
*pl* plural – cəm forması
*poss. pron* possessive pronoun – yiyəlik əvəzliyi
*pref* prefix – ön qoşma
*prep* preposition – sözönü
*pr.p* present participle – indiki zaman feli sifəti
*pron* pronoun – əvəzlik
*p p* past participle – keçmiş zaman feli sifəti
*p t* past tense – keçmiş zaman
*reflex. pron* reflexive pronoun – qayıdış əvəzliyi
*relat. adv* relative adverb – nisbi zərf
*relat. pron* relative pronoun – nisbi əvəzlik
*sing.* singular – tək forma
*sl* slang – slənq
*smb.* somebody – bir kəs, kimsə
*smth.* something – bir şey, nəsə
*s.o.* someone – bir kəs, kimsə
*suff* suffix – şəkilçi
*v* verb – fel

### LÜĞƏTDƏ İSTİFADƏ EDİLMİŞ FONETİK İŞARƏLƏR
### PHONETIC SYMBOLS USED IN THIS DICTIONARY

| samitlər consonants | | saitlər vowels | |
|---|---|---|---|
| samit simvollar- consonant symbols | açar sözlər key words | sait simvollar vowel symbols | açar sözlər key words |
| p | pen | i: | keep |
| b | bag | ɪ | tin |
| t | ten | e | bed |
| d | day | æ | map |
| k | kite | a: | calm |
| g | garden | ɔ | hot |
| tʃ | cheese | ɔ: | bought |
| dʒ | jam | u | put |
| f | five | u: | roof |
| v | view | ʌ | cut |
| θ | thing | ə: | girl |
| ð | this | ə | cupboard |
| s | soon | eɪ | make |
| z | zero | aɪ | kite |
| ʃ | fish | au | now |
| ʒ | measure | ɔɪ | boy |
| h | hot | ou | note |
| m | sum | ɪə | here |
| n | son | eə | there |
| ŋ | sing | uə | poor |
| l | lamp | eɪə | player |
| r | red | ouə | lower |
| j | yes | aɪə | tire |
| w | way | auə | tower |
| | | ɔɪə | employer |



# Lüğətin tərtibində istifadə edilmiş MƏNBƏLƏR

# SOURCES
## used in compiling this dictionary


**1.** Longman Dictionary of Contemporary English, printed in Great Britain at the Pitman Press, 1978.

**2.** The New American Dictionary of Good English, printed in the United States of America, 1987.

**3.** A.S.Hornby with the assistance of Christina Ruse, Oxford Student's Dictionary of Current English, Special edition for the USSR, Moscow, Oxford, Prosvesheniye Publishers, Oxford University Press, 1983.

**4.** The New Method English Dictionary by Michael Philip West, M.A., D. Phil, & James Gareth Endicott, M.A., The third edition, Longman, Green & Co., London, New York, Toronto.

**5.** Oxford-Russian Dictionary, Oxford University Press, Oxford, New York, 1995.

**6.** Webster's Dictionary of the English Language, New Revised Edition for School, Home and Office, 1991, by Thomas Nelson.

**7.** E.A.M.Wilson. The Modern Russian Dictionary for English Speakers. Pergamon Press. Oxford-New York-Toronto. Sidney-Paris-Frankfurt. 1982.

**8.** Learner's Dictionary of Current English. A.S.Hornby. Two volume edition. Oxford University Press, 1982.

**9.** Azərbaycan dilinin orfoqrafiya lüğəti (artırılmış və təkmilləşdirilmiş üçüncü nəşri), «Elm» nəşriyyatı, Bakı, 1975.

**10.** Azərbaycan dilinin izahlı lüğəti, 4 cilddə, Azərb.SSR Elmlər Akademiyası nəşriyyatı, Bakı, 1964-1987.

**11.** Azərbaycanca-İngiliscə Lüğət, 1 cilddə, prof. O.İ. Türksevərin (Musayev) redaktəsi ilə, Bakı – 1998.

**12.** Rusca-Azərbaycanca lüğət, Azərb.SSR EA müxbir üzvü Ə.Ə.Orucovun redaktəsi ilə; 1-ci cild (A-K), "Elm nəşriyyatı, Bakı, 1971; 2-ci cild (Ё-Ї), "Elm nəşriyyatı, Bakı, 1975; 3-cü cild, (P-Я), "Elm nəşriyyatı, Bakı, 1978.

**13.** Англо-русский словарь, составитель В.Л.Мюллер, Гос. из-во иностранных и национальных словарей, Москва, 1963.

**14.** Большой Англо-русский словарь, под общим руководством док. фил. наук, проф. И.И.Гальперина, изд. "Советская Энциклопедия", том 1, том 2, Москва, 1972.

**15.** Англо-русский фразеологический словарь, составитель А.В.Кунин, Гос. из-во иностранных и национальных словарей, Москва, 1955.

**16.** Русско-английский словарь, составители А.М.Таубе, А.В.Литвинова, А.Д.Миллер, Р.К.Даглиш, под редакцией Р.К.Даглиша, магистра гуманитарных наук Кембриджского университета, из-во "Советская Энциклопедия", Москва, 1965.

**17.** Русско-английский словарь, под общим руководством проф. А.И.Смирницкого, изд. 14-ое, стереотипное, под редакцией проф. О.С.Ахмановой, изд. "Русский язык", Москва, 1987.

**18.** О.С.Ахманова, Словарь лингвистических терминов, изд. "Советская Энциклопедия", Москва, 1966.

# İNGİLİS ƏLİFBASI
# ENGLISH ALPHABET

| | | | |
|---|---|---|---|
| **Aa** [eɪ] | **Bb** [bi:] | **Cc** [si:] | **Dd** [di:] |
| **Ee** [i:] | **Ff** [ef] | **Gg** [dʒi:] | **Hh** [eɪtʃ] |
| **Ii** [aɪ] | **Jj** [dʒeɪ] | **Kk** [keɪ] | **Ll** [el] |
| **Mm** [em] | **Nn** [en] | **Oo** [ou] | **Pp** [pi:] |
| **Qq** [kju:] | **Rr** [a:] | **Ss** [es] | **Tt** [ti:] |
| **Uu** [ju:] | **Vv** [vi:] | **Ww** [ˈdʌblju:] | **Xx** [eks] |
| **Yy** [waɪ] | **Zz** [zed] | | |



# Aa

**A, a** [eɪ] *n (pl* **A's, a's** [eɪz] *ingilis əlifbasının 1-ci hərfi;*

◊ **from A to Z** əvvəldən axıra qədər / kimi, başdan axıra qədər / kimi; **to know** ***smth.*** **from A to Z** ≅ bir şeyi kamil bilmək, bir şeyi əvvəldən axıra qədər / kimi bilmək

**A$^1$** [eɪ] *n amer.* ən yüksək qiymət, əla, beş; **straight A** (*tam*) əlaçı; *I have got (an) A in Geography Mən coğrafiyadan əla / beş almışam*

**A$^2$** [eɪ] *n fiz.* **ampere** *sözünün qısa forması*

**A$^3$** [eɪ] *n 14 yaşına çatmamış uşaqların baxması məsləhət görülməyən / bilinməyən film (İngiltərədə)*

**A-1** [ˌeɪˈwʌn] *adj* **1.** əla, çox yaxşı, yüksək keyfiyyətli; *The service in this restaurant is really A-1 Bu restoranda xidmət həqiqətən əladır/ çox yaxşıdır;* **2.** yaxşı vəziyyət *(hal haq); The child was ill yesterday, but he is feeling A-1 today Uşaq dünən xəstə idi, lakin bu gün özünü yaxşı hiss edir*

**AA$^1$** [ˌeɪˈeɪ] *n 14 yaşına çatmamış uşaqların baxması qadağan edilən/olunan film (İngiltərədə)*

**AA$^2$** [ˌeɪˈeɪ] *n* **Automobile Association** *söz birləşməsinin qısa forması*

**a$^1$** [eɪ, ə] **1.** *qeyri-müəyyənlik artiklı: reduksiya olunmamış forması* [eɪ]; *reduksiya olunmuş forması* [ə]; **2.** bir; **a minute** bir dəqiqə; *Wait a minute, please Zəhmət olmasa, bir dəqiqə gözlə / gözləyin;* **a word** bir söz; *Not a word did she say O, bir söz də demədi;* **a man** bir kişi; *A man wants to see you Bir kişi səni/sizi görmək istəyir; Come to us on a Sunday Bir bazar günü bizə gəl / gəlin;* **3. few, little, bit** *sözləri ilə işlədilir və müəyyən miqdar bildirir:* **a few days** bir neçə gün; **a little butter** bir az yağ; **a bit** bir az; *I'm a bit tired Mən bir az yorğunam/yorulmuşam;* **a bit of money** bir az pul; *Have you got a bit of money about/on you? Yanınızda bir az pulun /pulunuz varmı?* **4.** *Hər hansı bir sinfə daxil olan əşya və şəxslərdən biri haqqında danışılarkən həmin şəxs və ya əşyanı bildirən ismin qarşısında işlədilir. Bu halda qeyri-müəyyənlik artiklı dilimizə tərcümə edilmir:* **a book** kitab; *This is a book Bu, kitabdır;* **a teacher** müəllim; *She is a teacher O, müəllimdir;* **5.** *Hər hansı bir zümrəyə daxil olan isimlərin haqqında ümumi mənada danışarkən ismin qarşısında işlədilir. Bu halda qeyri-müəyyənlik artiklı dilimizə ya tərcümə edilmir, ya da* **hər (bir)** *söz birləşməsi vasitəsilə tərcümə edilir: A horse has four legs Atın (hər bir atın) dörd ayağı olur / var; A cow is a domestic animal İnək ev heyvanıdır;* **6.** biri; **a friend of mine** dostlarımdan biri; **7. bir** *sözü ilə tərcümə edilir ya da tərcümə edilmir:* **twice a week** həftədə iki dəfə; **once a year** ildə bir dəfə; **four times a day** (*bir*) gündə dörd dəfə; *We have English four times a week Bizim həftədə dörd dəfə ingilis dili dərsimiz olur;* **8.** *Sayıla bilməyən isimlərin qarşısında işlənərək növ bildirir. Bu halda qeyri-müəyyənlik artiklı dilimizə tərcümə edilmir. "Chinar" is a good wine "Çinar" yaxşı şərabdır;* **9.** *Sayılmayan isimlərin qarşısında işlənir. Bu halda ya dilimizə tərcümə edilmir, ya da* **bir** *sözü vasitəsilə tərcümə edilir:* **a weeping** (*bir*) ağlamaq səsi; *I heard a weeping in the kitchen Mən mətbəxdə (bir) ağlamaq səsi eşitdim;* **10. many** *sözü ilə işlənərək çoxluq, cəmlik bildirir;* **many a man** çox adam; **many a day** çox günlər, uzun müddət; **11.** *Xüsusi isimlərin qarşısında işlənərək onun ümumi isimə çevrildiyini bildirir. Bu halda qeyri-müəyyənlik artiklı dilimizə tərcümə edilmir; He thinks himself a Napoleon O özünü lap Napoleon hesab edir; He behaves like a Don Juan O özünü lap Don Juan kimi aparır;* **12.** *Xüsusi isimlərin qarşısında işlənir və ailənin bir üzvünün haqqında danışıldığını bildirir. Bu halda qeyri-müəyyənlik artiklı dilimizə* **biri** *sözü vasitəsilə tərcümə edilir. She married a Forsyte O, Forsaytlardan birinə ərə getdi*

**a$^2$** [ə] pref. *Azərbaycan türkcəsində əsasən inkar məna bildirən* **-sız, -siz, -suz, -süz** *şəkilçilərinə uyğun gəlir:* amoral əxlaq**sız**; amorphous formasız; asyndetic şəkilçi**siz**

**a$^3$** *vəziyyət bildirən sözlərin əvvəlində işlənən şəkilçi:* afraid, ablaze, afloat, *etc.*

**abacus** [ˈæbəkəs] *n (pl* **-ci, -ses***)* çötkə, sayğac

**abandon** [əˈbændən] *v* **1.** tərk etmək; çıxıb getmək, atıb getmək; **to ~** ***smb.*** bir kəsi tərk etmək; **to ~ a sinking ship** batan gəmini tərk etmək; **to ~** ***one's*** **family** ailəsini atıb getmək, ailəsini tərk etmək; *He abondoned his family O, ailəsini atıb getdi O, ailəsini tərk etdi;* **2.** dayandırmaq, əl çəkmək; **to ~ all hopes** bütün ümidlərindən əl çəkmək; *The search was abandoned when night came Gecə düşəndə axtarış dayandırıldı/ taxirə salındı;* **3.** qapılmaq, uymaq; **to ~ to despair** ümidsizliyə qapılmaq; **to ~ oneself to passion** ehtirasa qapılmaq/uymaq;

◊ **to ~** ***smb.*** **to his fate** bir kəsi taleyin ümidinə buraxmaq

**abandoned** [əˈbændənd] *adj* **1.** atılmış, tərk edilmiş; **2.** pozğun, əxlaqsız; **~ woman** pozğun / əxlaqsız qadın

**abase** [ə'beɪs] *v* 1. hörmətdən salmaq; alçaltmaq; **to ~ oneself** özünü hörmətdən salmaq/alçaltmaq; 2. alçaltmaq *(vəzifədə, rütbədə və s.)*
**abasement** [ə'beɪsmənt] *n* 1. alçaltma, hörmətdən salma; 2. alçalma *(vəzifədə, rütbədə və s.)*
**abash** [ə'bæʃ] v utandırmaq, pərt etmək; karıxdırmaq
**abashed** [ə'bæʃt] adj xəcalət çəkmiş, pərt olmuş; *She wasn't a bit abashed at / by this O bundan zərrə qədər də xəcalət çəkmədi*
**abashment** [ə'bæʃmənt] *n* utanma, sıxılma, karıxma; xəcalət, xəcalət çəkmə, pərtlik
**abate** [ə'beɪt] *v* 1. zəiflətmək; kütləşdirmək; **to ~ the pain** ağrını zəiflətmək / kütləşdirmək; 2. endirmək, aşağı salmaq; **to ~ the edge** tiyəni kütləşdirmək; **to ~ of/from the price** qiyməti endirmək / aşağı salmaq; 3. zəifləmək *(tufan, epidemiya və s. haq.)*; *The storm has abated Tufan zəifləyib*
**abatement** [ə'beɪtmənt] *n* 1. zəifləmə, azalma; yumşalma; **~ of a storm** tufanın zəifləməsi /azalması; 2. güzəşt; enmə, aşağı düşmə; **to make ~** güzəşt etmək, enmək; qiyməti aşağı salmaq; *No abatement made! Möhkəm qiymətə!*
**abbey** ['æbɪ] *n* 1. monastır; 2. *top. i* rahiblər; rahibələr; ◊ **~ lubber** tüfeyli, müftəxor
**abbreviate** [ə'bri:vɪeɪt] v qısaltmaq, ixtisar etmək; **to ~ a story** hekayəni qısaltmaq/ ixtisar etmək; **to ~ a word** sözü qısaltmaq; **to ~ a speech** nitqi qısaltmaq/ixtisar etmək
**abbreviation** [ə͵bri:vɪ'eɪʃn] *n* 1. ixtisar, qısaltma, ixtisar etmə; 2. sözün qısa/ ixtisar edilmiş forması; *Mr is the abbreviation of Mister Mr Mister sözünün qısa /ixtisar edilmiş formasıdır*
**abbreviator** [ə'brɪ:vɪeɪtə(r)] *n* qısaldan/ixtisar edən adam/şəxs
**ABC** ['eɪ'bi:'si:] *n* 1. əlifba; 2. əlifba kitabı; 3. başlanğıc, əsas; **~ physics** fizikanın əsasları
**ABC-book** ['eɪbi:si:buk] *n* əlifba kitabı
**abdicate** ['æbdɪkeɪt] *v* 1. **(from)** imtina etmək, əl çəkmək *(rəsmi vəzifədən)*; **to ~ (from) the Throne** taxt-tacdan imtina etmək /əl çəkmək; 2. boynundan atmaq, imtina etmək *(məsuliyyətdən, hüquqdan və s.)*; **to ~ all responsibility** hər cür məsuliyyətdən imtina etmək / boyun qaçırmaq; *She abdicated all responsibility for the care of the child O, uşağa hər cür qayğı göstərməkdən imtina etdi*
**abdication** [͵æbdɪ'keɪʃn] *n* 1. əlçəkmə, imtina etmə *(taxt-tacdan, hakimiyyətdən)*; 2. vəzifədən imtina etmə; üzərindən atma, üzərindən götürmə *(məsuliyyəti, vəzifəni)*
**abdomen** ['æbdəmən] *n* 1. *anat.* qarın; qarın boşluğu, 2. qarıncıq *(həşəratlarda)*
**abdominal** [æb'dɔmɪnl] *adj* qarın; **~ murmur** qarın qurultusu; **~ cavity** *anat.* qarın boşluğu; **~ wall** qarın divarı
**abdominous** [æb'dɔmɪnəs] *adj* yekəqarın, yoğunqarın; kök

**abduct** [æb'dʌkt] *v* oğurlamaq, qaçırmaq *(zorla, aldatmaqla: xüsusən qadını, qızı və ya uşağı); The police think that the missing girl has been abducted Polis bu fikirdədir ki, yoxa çıxmış qız qaçırılıb / oğurlanıb*
**abduction** [æb'dʌkʃn] *n* oğurlama, zorla qaçırma *(xüs. qızı, qadını və ya uşağı)*; **child ~** uşaq oğurluğu
**abductor** [æb'dʌktə(r)] *n* oğru, oğurlayan, qaçıran *(xüs. qızı, qadını, uşağı)*
**aberrant** [æ'berənt] *adj* doğru yoldan çıxmış, azmış
**aberration** [͵æbɪ'reɪʃn] *n* 1. doğru yoldan azma / çıxma; azma, çaşma; 2. fikrin dumanlanması
**abet** [ə'bet] *v* qızışdırmaq, fitləmək, təhrik /sövq etmək *(bir işi görməyə)*; **to ~ *smb.* in a crime** bir kəsi cinayətə təhrik / sövq etmək
**abetment** [ə'betmənt] *n* təhrikçilik, qızışdırma
**abettor** [ə'betə(r)] *n* 1. cinayət yoldaşı; 2. təhrikçi, fitnəçi, fitnə verən
**abhor** [əb'hɔ:(r)] *v* (-rr-) nifrət etmək, nifrət bəsləmək; *I abhor flattery Mən yaltaqlığa nifrət edirəm*
**abhorrence** [əb'hɔrəns] *n* nifrət, ikrah; **to hold in ~** nifrət bəsləmək
**abhorrent** [əb'hɔrənt] *adj* ikrah doğuran; nifrətəlayiq, iyrənc, qəbih, alçaq, mənfur, rəzil; *Cruelty is abhorrent to him Qəddarlıq onda ikrah doğurur*
**abide** [ə'baɪd] *v* I *(pt, pp* **abided** [ə'baɪdɪd] *(Adətən sual və inkar cümlələrdə* **can, (could)** *feli ilə işlənir)* 1. dözmək, tab gətirmək; *I cannot abide to see/seeing such cruelty Mən belə qəddarlığa dözə bilmirəm; How could you abide such awful condition? Sən/Siz belə dəhşətli şəraitə necə dözürsən/dözürsünüz?*; 2. gözləmək; **to ~ *one's* time** münasib vaxt gözləmək; **to ~ *one's* fate** tale qismətini gözləmək
**abide** [ə'baɪd] *v arx.* II *(pt, pp* **abode** [ə'boud] *və ya* **abided** [ə'baɪdɪd]) 1. qalmaq; **to ~ with *smb.*** bir kəslə qalmaq; *Abide with me Mənimlə qal /qalın*; 2. yaşamaq *(bir yerdə)*; **to ~ with *smb.*** bir kəslə yaşamaq; **the right to enter and ~ in a country** bir ölkəyə daxil olmaq və yaşamaq hüququ;
◊ **to ~ by *smth.*** bir şeyə riayət etmək/ sadiq qalmaq; **to ~ a decision** qərara riayət etmək; **to ~ agreement** müqaviləyə riayət etmək/sadiq qalmaq; *If you join a club, you have to abide its rules Əgər kluba üzv olsan/olsanız, onun qaydalarına riayət etməlisən/etməlisiniz*
**abiding** [ə'baɪdɪŋ] *adj* möhkəm, davamlı; **an ~ friendship** möhkəm / davamlı dostluq; **an ~ memory** möhkəm yaddaş
**ability** [ə'bɪlɪtɪ] *n* 1. bacarıq, qabiliyyət; **a man of ~** bacarıqlı / qabiliyyətli adam; **~ for music** musiqi qabiliyyəti; 2. istedad; zəka; **a man of great musical ~** böyük musiqi istedadı olan adam



**abject** ['æbdʒekt] *adj* miskin, alçaq, rəzil; **an ~ slave** miskin qul; **~ flatterer** rəzil / alçaq yaltaq
**abjuration** [͵æbdʒuə'reɪʃn] *n* dönmə, üz döndərmə; imtina etmə, boyun qaçırma
**abjure** [əb'dʒuə(r)] *v* əl çəkmək, üz döndərmək; **to ~ a claim** tələbdən /iddiadan əl çəkmək; **to ~ *one's* religion** dinindən dönmək / üz döndərmək / əl çəkmək
**ablative** ['æblətɪv] *n qram.* ablativ *(latın dilində ismin hal formasının adı: birgəlik halı)*
**ablaut** ['æblaut] *n dilç.* ablaut *(bəzi dillərdə sözlərin müxtəlif işlənmə məqamında dəyişməsi: ingilis dilində* **drink, drank, drunk** *söz formalarında olduğu kimi)*
**ablaze** [ə'bleɪz] *adj* yanan, parlayan, işığa qərq olan; **to be ~** alovlanmaq, yanmaq, işığa qərq olmaq, şölələnmək, parlamaq; *The house was soon ablaze Ev tez bir zamanda alovlandı; The room was ablaze Otaq işığa qərq olmuşdu; The ladies were ablaze with jewels Xanımlar daş-qaş içində parlayırdılar;*
◊ **~ with anger** acıqdan/hirsdən alışıb yanan /alovlanan; *Her cheeks are ablaze with anger Onun yanaqları acıqdan/hirsdən alışıb yanır*
**able** ['eɪbl] *adj* **(-r, -est)** 1. bacarıqlı, qabiliyyətli; **an ~ student** bacarıqlı/ qabiliyyətli tələbə; 2. ağıllı, istedadlı; **an ~ actor** istedadlı aktyor; **to be ~** bacarıqlı olmaq, bilmək, bacarmaq; **to be ~ to walk** gəzməyi/yeriməyi bacarmaq; *The child is able to walk Uşaq yeriməyi/ gəzməyi bacarır; Are you able to speak English? Sən /Siz ingiliscə danışmağı bacarırsanmı?/ bacarırsınızmı? Sən / Siz ingiliscə danışa bilirsənmi? / bilirsinizmi?*
**-able, -ible** [əbl] *suff. Fellərin əsasına əlavə edilərək sifət düzəldir:* **eatable** yeməli; **drinkable** içməli; **suitable** yarayan, əlverən
**able-bodied** ['eɪbl'bɔdɪd] *adj* möhkəm bədənli, sağlam, sağlam bədənli; yarayan, yararlı *(hərbi xidmətə)*
**ablution** [ə'blu:ʃn] *n* dəstəmaz; dəstəmaz alma
**ablutions** [ə'blu:ʃnz] *n* 1. yuma, yuyub təmizləmə; yuyunma, yuyunub təmizlənmə; 2. dəstəmaz alma, dəstəmaz
**ably** ['eɪblɪ] *adv* bacarıqla, məharətlə, ustalıqla; **to play a horn ~** məharətlə/ustalıqla şeypur çalmaq
**abnormal** [æb'nɔ:məl] *adj* anormal, qeyri-normal; **an ~ child** anormal uşaq; **~ temperature** anormal temperatur
**abnormality** [͵æbnɔ:'mælɪtɪ] *n* 1. anormallıq, qeyri-normallıq; **physical ~** fiziki anormallıq; 2. anomaliya, qeyri-adilik
**aboard** [ə'bɔ:d] *adv* göyərtəyə, gəmiyə; qatara, təyyarəyə; *All aboard! Minik başlanır! It's time to go aboard Gəmiyə minmək vaxtıdır They went aboard the ship Onlar gəminin göyərtəsinə getdilər*

**abolish** [ə'bɔlɪʃ] *v* ləğv etmək; **to ~ slavery** quldarlığı ləğv etmək; **to ~ taxes** vergiləri ləğv etmək; **to ~ exploitation** istismarı ləğv etmək
**abolishment** [ə'bɔlɪʃmənt] *n* ləğv, ləğv etmə/ edilmə
**abolition** [͵æbə'lɪʃn] *n* ləğv etmə, ləğv; ləğv edilmə; **the ~ of capital punishment** ölüm cəzasının ləğvi/ləğv edilməsi; **the ~ of slavery** quldarlığın ləğvi / ləğv edilməsi
**abolitionist** [͵æbə'lɪʃənɪst] *n* ləğvin tərəfdarı, ləğvedilməni istəyən/müdafiə edən
**A-bomb** ['eɪ bɔm] *n* atom bombası
**abominable** [ə'bɔmɪnəbəl] *adj* iyrənc, ikrah doğuran, çox pis; **~ weather** çox pis / iyrənc hava
**abominate** [ə'bɔmɪneɪt] *v* nifrət etmək, nifrət bəsləmək, zəhləsi getmək
**abomination** [ə͵bɔmɪ'neɪʃn] *n* nifrət, ikrah; **to hold in ~** nifrət bəsləmək
**aboriginal**[1] [͵æbə'rɪdʒənl] *n* aborigen, yerli əhali
**aboriginal**[2] [͵æbə'rɪdʒənl] *adj* yerli *(xüs. Avstraliyada)*; **~ citizens** yerli vətəndaşlar
**aborigines** [͵æbə'rɪdʒɪni:z] *n* aborigenlər, yerli əhali *(xüs. Avstraliyada yaşayanlar)*
**abort** [ə'bɔ:t] *v* 1. uşaq salmaq/saldırmaq; 2. boşa çıxmaq, baş tutmamaq; *Our plans aborted Bizim planlarımız boşa çıxdı / baş tutmadı*
**abortion** [ə'bɔ:ʃn] *n* 1. abort, uşaqsalma, uşaqsaldırma, vaxtından əvvəl hamiləlikdən azad olma; *She had an abortion O, uşaq saldı /saldırdı*; 2. yarımçıq doğulmuş uşaq; 3. müvəffəqiyyətsizlik, uğursuzluq
**abortionist** [ə'bɔ:ʃənɪst] *n* xəlvəti /qeyri-qanuni abortla məşğul olan adam /həkim
**abortive** [ə'bɔ:tɪv] *adj* 1. vaxtından əvvəl *(doğum haq.)*; 2. faydasız, boş, bihudə; **~ attempt** faydasız/boş cəhd; **an ~ rebellion** baş tutmayan qiyam; 3. *tib.* aborta səbəb olan
**abortively** [ə'bɔ:tɪvlɪ] *adv* boş yerə, bihudə, faydasız, boş-boşuna
**abound** [ə'baund] *v* 1. bol olmaq, çox olmaq; *Fish abound in this sea Bu dənizdə balıq boldur*; 2. **(in, with)** zəngin olmaq; **land ~ in oil** neftlə zəngin torpaq; **woods ~ with game** ov quşları ilə zəngin meşələr; *He abounds in courage O, çox cəsarətlidir*
**about**[1] [ə'baut] *adv* 1. hər tərəfdə/yerdə, hər tərəfə /yerə, hara gəldi; *Don't leave papers lying about Kağızları hara gəldi qoyma/qoymayın; There is a rumour about Hər tərəfdə şayiə gəzir*; 2. irəli-geri, var-gəl *(otaqda, küçədə və s.)*; **to stroll the streets ~** küçədə var-gəl etmək; 3. təxminən, demək olar ki, **~ two o'clock** təxminən saat iki; **~ your size** təxminən/demək olar ki, sənin/sizin ölçün/ölçünüz; *That's about right Demək olar ki, o, düzdür*; 4. *Özündən sonra işlənən məsdərlə bir işi görməyə hazır olmanı göstərir;* **to be ~ to do *smth.*** bir işi görməyə hazırlaşmaq, bir işi görmək

fikrində olmaq; *He was about to leave the room when I entered in Mən içəri girəndə o, otağı tərk etmək istəyirdi /üzrə idi;*

◊ **to look** ~ ətrafa baxmaq; **to be** ~ **1)** işlə məşğul olmaq; *What are you about? Sən/Siz nə ilə məşğulsan / məşğulsunuz? Sən/siz nə etmək fikrindəsən/fikrindəsiniz;* **2)** ayaq üstündə olmaq *(xəstəlikdən durmaq)*; **to be up and** ~ xəstəlikdən sağalıb ayağa qalxmaq; *What is it all about? Nə olub? Nə baş verib?*

**about[2]** [ə'baut] *prep* **1.** *İsmin qarşısında işlənərək məkan mənasını bildirir:* ətrafında, dövrəsində; ~ **the garden** bağın ətrafında; *There was a fence about the garden Bağın ətrafında hasar vardı;* **2.** *İsmin qarşısında işlənərək yer, məkan bildirir. Bu halda dilimizə ismin yerlik hal şəkilçisi (-da, -də) vasitəsilə tərcümə edilir:* **to walk** ~ **the garden** bağda gəzmək; **3.** haqqında, barəsində; **to speak/to think/to write about smb./smth.** bir kəs /bir şey haqqında danışmaq / fikirləşmək / yazmaq; **4.** *Bir şeyin bir kəsin yanında olub-olmamasını bildirir:* yanında; *Have you any money about you? Yanında heç pulun varmı? What is wrong about him? Ona nə olub? What is wrong about the colour? Rəngin nəyindən xoşun gəlmir? Rəngin nəyi pisdir?*

**about-face** [ə'bautfeis] *n* fikrin/rəyin tam dəyişməsi

**about-turn** [ə,baut'tə:n] *inter hərb. Geriyə dön! (komanda)*

**above[1]** [ə'bʌv] *adj* yuxarıdakı; **the** ~ **sentence** yuxarıdakı cümlə; *For an explanation see the above sentence İzahat üçün yuxarıdakı cümləyə bax / baxın*

**above[2]** [ə'bʌv] *adv* **1.** yuxarıda; **the facts mentioned** ~ yuxarıda xatırladılmış faktlar; **2.** çox, daha çox; **10 and** ~ 10 və daha çox; **3.** başımızın üstündəki; *The clouds above began to get thicker Başımızın üstündəki buludlar qalınlaşmağa başladı*

**above[3]** [ə'bʌv] *prep* **1.** üstündə; ~ **the clouds** buludların üstündə; *Our plane was flying above the clouds Bizim təyyarəmiz buludların üstündə uçurdu;* **2.** yuxarı *(çincə, rütbəcə)*, üst; *A colonel is above a major Polkovnik mayordan yuxarıdır (yuxarı rütbədədir); They live above us Onlar bizdən yuxarıda (yəni yuxarı mərtəbədə) yaşayırlar;* **3.** çox, artıq; ~ **hundred** yüzdən çox/artıq; *There were above 5000 people Orada 5000-dən artıq adam vardı;* **4.** *Bəzi hallarda dilimizə* ***uzaqdır, gəlməz*** *kimi sözlərlə tərcümə edilir: He is above stealing O, oğurluqdan uzaqdır (yəni oğurluq etməz); Her beauty is above praise Onun gözəlliyi tərifə gəlməz*

◊ ~ **all** hər şeydən artıq/vacib; *He longs above all to see his family again O hər şeydən artıq / vacib ailəsini görmək istəyir;* **over and** ~ əlavə olaraq; ~ **oneself 1)** özündən bədgüman; **2)** həyəcanlı

**above-board[1]** [ə'bʌv'bɔ:d] *adj* açıq, aydın, açıq-aydın; *His part in the affair was quite above-board Onun bu məsələdə iştirak etməsi açıq-aydın idi*

**above-board[2]** [ə'bʌv'bɔ:d] *adv* açıq, aydın, açıq-aydın; *d.d.* yalan-palansız

**above-mentioned** [ə'bʌv'menʃnd] *adj* yuxarıda xatırladılmış, yuxarıda deyilmiş; **the** ~ **facts** yuxarıda xatırladılmış faktlar / dəlillər

**abovesaid** [ə'bʌv'sed] *adj d.d.* = **above-mentioned**

**abrade** [ə'breid] *v* **1.** soymaq, sıyırmaq *(dərini)*; **2.** sürtmək, sürtüb aparmaq *(xüs. dərini)*; **3.** *tex.* cilalamaq, pardaqlamaq, sürtmək, sürtüb təmizləmək

**abrasion** [ə'breiʒən] *n* **1.** sürtünmə, sürtülmə, sürtülüb yeyilmə; **2.** *tex.* cilalanma; sürtülüb yeyilmə

**abrasive[1]** [ə'breisiv] *n tex.* cilalayıcı maddə *(qum və s.)*

**abrasive[2]** [ə'breisiv] *adj* **1.** *tex.* cilalayıcı; **an** ~ **disc** cilalayıcı disk *(dairəşəkilli lövhə)*; **2.** kobud; əsəbiləşdirici, əsəblərə toxunan; **a** ~ **voice** əsəbiləşdirici səs

**abreast** [ə'brest] *adv* cərgə ilə, yanaşı, bir cərgədə; **to keep** ~ **of/with** cərgə ilə getmək, cərgədən qalmamaq; **three** ~ üç cərgə ilə; **lines of soldiers marching 5** ~ 5 cərgə ilə gedən əsgər cərgələri;

◊ **to be/to keep** ~ **of the times** zamanla ayaqlaşmaq, həyatdan geri qalmamaq

**abridge** [ə'bridʒ] *v* **1.** qısaltmaq, ixtisar etmək; **to** ~ **a story** hekayəni qısaltmaq; **2.** məhdudlaşdırmaq *(hüququ, imtiyazı və s.)*; **3.** **(of, from, in)** məhrum etmək

**abridged** [ə'bridʒd] *adj* qısaldılmış; **an** ~ **story** qısaldılmış hekayə

**abridgement** [ə'bridʒmənt] *n* qısaldılma, qısalma; ~ **of a story** hekayənin qısaldılması; *This manuscript requires no abridgement Bu əlyazmanı qısaltmağa ehtiyac yoxdur*

**abridgment** [ə'bridʒmənt] *n* = **abridgement**

**abroad[1]** [ə'brɔ:d] *adv* **1.** xaricə, xarici ölkəyə; **to go** ~ xaricə / xarici ölkəyə getmək; **2.** xaricdə, xarici ölkədə; **to live** ~ xaricdə/xarici ölkədə yaşamaq; **3.** hər tərəfə, hər yana; *The news soon spread abroad Tezliklə xəbər hər tərəfə yayıldı;* **4.** çöldə, bayırda; *There was no one abroad at that early hour Belə erkən saatda bayırda heç kim/ kəs yox idi;* **from** ~ xaricdən;

◊ **all** ~ həqiqətdən uzaq; *I may be a little abroad Ola bilsin ki, mən həqiqətdən bir az uzağam Ola bilsin ki, mən (bir az) səhv edirəm;* **to be all** ~ çaşmaq, özünü itirmək

**abroad[2]** [ə'brɔ:d] *prep d.d.* hər tərəfdə, hər yerdə; bütün; ~ **the world** dünyanın hər tərəfində /hər yerində, bütün dünyada

**abrogate** ['æbrougeit] *v* ləğv etmək *(qanunu və s.)*; **to** ~ **a law** qanunu ləğv etmək



**abrogation** [,æbrə'geiʃn] *n* ləğv etmə *(qanunu və s.)*

**abrupt** [ə'brʌpt] *adj* **1.** gözlənilməz, gözlənilməyən, birdən, qəfil; ~ **departure** gözlənilmədən yola düşmə/getmə; ~ **stop** qəfil dayanma; **2.** kəskin, kobud *(hərəkət, davranış və s.)*; **3.** sıldırım, sıldırımlı, yalçın; ~ **coast** sıldırım(lı) sahil

**abruptly** [ə'brʌptli] *adv* **1.** gözlənilmədən, qəflətən, birdən; kəskin; *He left abruptly O, qəflətən çıxıb getdi;* **2.** qırıq-qırıq, kəsik-kəsik, rabitəsiz; **to speak** ~ qırıq-qırıq/kəsik-kəsik danışmaq

**abruptness** [ə'brʌptnis] *n* **1.** gözlənilməzlik, anilik; **2.** kəskinlik, kobudluq *(davranış və s.)*; **3.** rabitəsizlik, əlaqəsizlik *(üslub haq.)*

**abscess** ['æbsis] *n* abses, irinlik, irinli şiş

**abscission** [æb'siʒn] *n* **1.** *tib.* kəsmə, amputasiya *(bədənin hər-hansı bir üzvünün kəsilməsi)* **2.** *bot.* tökülmə *(yarpaq, meyvə və s. haq.)*; ~ **of leaves /fruits** yarpaqların /meyvələrin tökülməsi

**abscond** [əb'skɔnd] *v* qaçmaq, qaçıb gizlənmək *(təqibdən, məhkəmədən)*, aradan çıxmaq; *He absconded with the cash O, pulu götürüb aradan çıxdı*

**absence** ['æbsəns] *n* **1.** olmama, yoxluq; buraxma; ~ **from school** dərs buraxma; ~ **from work** proqul *(üzürsüz işə gəlməmə)*; **during/in smb.'s** ~ bir kəs olmayanda; *Did anything happen in my absence? Mən olmayanda bir şey baş verdimi? Please, look after my house during my absence Zəhmət olmasa, mən olmayanda mənim evimdən göz-qulaq ol(un)*; **to be sentenced in one's** ~ *hüq.* qiyabi olaraq məhkum olunmaq; **2.** çatışmazlıq, yoxluq, çatmama; **in the** ~ **of** çatmadığına/ olmadığına görə; **in the** ~ **of evidence** dəlil/sübut olmadığından/olmadığına görə; **the** ~ **of witnesses** şahidlərin olmaması üzündən; **3.** huşsuzluq *(əsas.* ~ **of mind** *birləşməsində)*;

◊ *Absence makes the heart grow fonder at söz* ≅ *Ayrılıq məhəbbəti artırır/artırar, Ayrılıq ürəyi yumşaldır/yumşaldar*

**absent[1]** ['æbsənt] *adj* **1.** olmayan, gəlməyən, iştirak etməyən; **to be** ~ iştirak etməmək, olmamaq; **to be** ~ **from school** dərsə /məktəbə gəlməmək, dərs buraxmaq; **to be** ~ **from work** işə gəlməmək, işdə olmamaq; *How many students are absent today? Bu gün neçə tələbə gəlməyib?* **2.** dalğın, fikirli; ~ **look** dalğın / fikirli baxış

**absent[2]** [æb'sent] *v*: **to** ~ **oneself from smth. 1)** bir şeydən boyun qaçırmaq; **2)** bir yerdə iştirak etməmək *(üzürlü səbəb olmadan)*; *He absented himself from the meeting Üzürlü səbəb olmadan o, iclasda iştirak etmədi*

**absentee** [,æbsən'ti:] *n* **1.** iştirak etməyən *(şəxs)*; *There were many absentees from the meeting İclasda çoxlu/xeyli adam iştirak etmirdi;* **2.** *hərb.* icazəsiz gedən *(əsgər)*; **3.** proqulçu, üzürsüz işə gəlməyən adam

**absently** [,æbsəntli] *adv* dalğın-dalğın, dalğın halda, fikirli, fikirli-fikirli

**absent-minded** [,æbsənt'maindid] *adj* huşsuz, dalğın, unutqan, fikirli; **an** ~ **man** huşsuz adam / kişi

**absent-mindedly** [,æbsənt'maindidli] *adv* huşsuz, dalğın, huşsuz / dalğın halda

**absent-mindedness** [,æbsənt'maindidnis] *n* huşsuzluq, unutqanlıq, dalğınlıq

**absolute** ['æbsəlu:t] *adj* **1.** mütləq, kamil, tam, şərtsiz; ~ **majority** mütləq çoxluq; ~ **indifference** tam laqeydlik; ~ **beauty** kamil gözəllik; ~ **promise** şərtsiz vəd; ~ **power** qeyri-məhdud /mütləq hakimiyyət; ~ **control** qeyri-məhdud /tam nəzarət; **2.** təmiz, qatışıqsız; ~ **alcohol** təmiz spirt; **3.** həqiqi, şübhəsiz, şübhə doğurmayan; ~ **fact** həqiqi /şübhəsiz/şübhə doğurmayan fakt / dəlil

**absolutely** ['æbsəlu:tli] *adv* büsbütün, tamamilə; əlbəttə; *-Are you sure? -Absolutely -Siz əminsinizmi? -Əlbəttə*

**absolution** [,æbsə'lu:ʃn] *n* **1.** *(xüs. Xristian dinində)* günahı /qəbahəti bağışlama; **2.** *hüq.* bəraət; bağışlama, bağışlanma; azad etmə *(məsuliyyətdən, cəzadan və s.)*

**absolutism** ['æbsəlu:tizm] *n* absolyutizm, absolyutluq *(hakimiyyət haq.)*

**absolutist** ['æbsəlu:tist] *n* absolyutizm tərəfdarı, mütləqiyyət tərəfdarı

**absolve** [əb'zɔlv] *v* **1.** bəraət vermək; **2.** **(from)** bağışlamaq; **to** ~ **from blame** günahı / təqsiri bağışlamaq

**absorb** [əb'sɔ:b] *v* **1.** özünə/canına çəkmək, hopdurmaq, udmaq, sormaq; **to** ~ **heat** istini udmaq; **paper which** ~**s ink** mürəkkəbi özünə çəkən kağız; **2.** *məc.* bilik kəsb/əldə etmək; cəlb etmək *(diqqəti)*; *His work absorbed him İşi onu bərk məşğul etdi; O, işinə qapıldı;* **3.** dalmaq, qərq olmaq *(fikrə, xəyala və s.)*; **to be** ~**ed in thought /in one's own thoughts** fikrə / xəyallara dalmaq

**absorbable** [əb'sɔ:bəbl] *adj* udan, özünə çəkə bilən, udma qabiliyyətinə / xüsusiyyətinə malik olan

**absorbency** [əb'sɔ:bənsi] *n* udma qabiliyyəti, hopdurma qabiliyyəti

**absorbent[1]** [əb'sɔ:bənt] *n* özünə/canına çəkən maddə, uducu maddə

**absorbent[2]** [əb'sɔ:bənt] *adj* özünə çəkən, hopdurma qabiliyyəti olan; aktivləşdirilmiş; ~ **coal** aktivləşdirilmiş kömür; ~ **cotton/cotton-wool** hiqroskopik *(rütubəti özünə çəkən)* pambıq

**absorber** [əb'sɔ:bər] *n tex. kim. fiz.* absorber, uducu cihaz *(buxar, qaz və s. tutmaq üçün )*

**absorbing** [əb'sɔ:biŋ] *adj* **1.** çox maraqlı, cəzbedici; əyləncəli; **an** ~ **book** çox maraqlı/ əyləncəli kitab; **2.** udma, canına çəkmə; ~ **capacity** /

power udma / canına çəkmə qabiliyyəti; 3. *tex.* yumşaldan, azaldan *(zərbəni)*

**absorption** [əb'sɔ:pʃn] *n* 1. udma, özünə çəkmə, hopdurma *(mayeni)*; 2. dalma *(fikrə və s.)*

**absorptivity** [ˌæbsɔ:p'tıvıtı] *n* udma / hopdurma qabiliyyəti, udma keyfiyyəti

**abstain** [əb'steın] *v* 1. çəkinmək, vaz keçmək; **to ~ from force** güc/zor işlətməkdən çəkinmək /vaz keçmək/əl çəkmək; **to ~ from drinking** içməkdən əl çəkmək; **to ~ from meat** ət yeməkdən əl çəkmək, ət yeməmək; 2. bitərəf qalmaq *(seçkidə)*; **to ~ from voting** səsverməde bitərəf qalmaq

**abstainer** [əb'steınəʳ] *n* 1. içki içməyən adam, dilinə içki vurmayan adam; 2. seçkidə bitərəf qalan adam

**abstemious** [æb'sti:mjəs] *adj* 1. nəfsini saxlayan, özünü saxlayan, pəhrizkar; 2. qənaətcil, qənaətkar

**abstention** [æb'stenʃn] *n* 1. özünü saxlama, çəkinmə; nəfsini saxlama; 2. bitərəflik *(səsvermədə)*

**abstentious** [æb'stenʃəs] *adj* təmkinli, toxtaq; nəfsini saxlayan, özünü saxlayan; çəkinən; səbirli

**abstinence** ['æbstınəns] *n* 1. **(from)** özünü saxlama, çəkinmə; mötədillik; **day of ~** pəhriz günü; 2. ayıqlıq, içki içməmə

**abstinency** ['æbstınənsı] *n* özünü saxlama, tamah etməmə; orucu gözləmə

**abstinent**[1] ['æbstınənt] *n* 1. təmkinli/toxtaqlı adam; 2. nəfsini saxlayan adam

**abstinent**[2] ['æbstınənt] *adj* 1. təmkinli, toxtaq, nəfsini saxlayan *(yeməkdən)*; 2. pəhriz saxlayan

**abstract**[1] ['æbstrækt] *n* 1. abstraksiya, mücərrəd fikir; mücərrəd termin; 2. xülasə, icmal, referat; 3. mücərrəd sənət əsəri

**abstract**[2] ['æbstrækt] *adj* 1. mücərrəd; **~ nouns** mücərrəd isimlər; *The word "hunger" is an abstract noun "Hunger" sözü mücərrəd isimdir;* 2. çətin başa düşülən /anlaşılan

**abstract**[3] ['æbstrækt] *v* 1. mücərrədləşdirmək; 2. məruzə oxumaq, xülasə etmək, məzmununu şərh etmək

**abstracted** [æb'stræktıd] *adj* 1. fikrə dalmış, fikirli; huşsuz; 2. uzaq, uzaqlaşdırılmış; 3. *arx.* mücərrəd

**abstraction** [æb'strækʃn] *n* 1. mücərrədlik; 2. fikri dağınıqlıq, huşsuzluq, unutqanlıq; 3. mücərrəd sənət əsəri

**abstruse** [æb'stru:s] *adj* 1. aydın olmayan, anlaşılmaz; 2. dərin *(fikir və s.)*

**absurd** [əb'sɔ:d] *adj* cəfəng, mənasız, boş; **~ things** cəfəng/mənasız şeylər; **~ suggestion** cəfəng/mənasız təklif

**absurdity** [əb'sɔ:dıtı] *n* cəfəngiyyat, cəfənglik, axmaqlıq, ağılsızlıq; sarsaqlıq

**absurdly** [əb'sɔ:dlı] *adv* cəfəng, boş, mənasız, axmaq-axmaq, boş-boş

**absurdness** [əb'sɔ:dnıs] *n* cəfənglik, axmaqlıq, səfehlik; mənasızlıq

**abundance** [ə'bʌndəns] *n* bolluq, çoxluq; vardövlət, zənginlik; **to live in ~** bolluq / zənginlik içərisində yaşamaq

**abundant** [ə'bʌndənt] *adj* bol, çox, çoxlu; **to be ~** bol/çox olmaq, çoxlu olmaq; *Police have abundant proof of his guilt Onun günahı barədə polisin əlində çox/ çoxlu sübut var*

**abuse**[1] [ə'bju:s] *n* 1. söyüş; danlaq; təhqir; **to exchange ~** bir-birini təhqir etmək; 2. səhv işlənmə; təhqir olunma; **~ of words /terms** sözlərin /terminlərin təhrif olunması; 3. sui-istifadə; **~ of power** hakimiyyətdən sui-istifadə

**abuse**[2] [ə'bju:z] *v* 1. təhqir etmək; danlamaq, abrını almaq, yamanlamaq; 2. pis rəftar etmək, kobud yanaşmaq/rəftar etmək; 3. sui-istifadə etmək; **to ~ rights / privileges** hüquqdan / imtiyazdan sui-istifadə etmək; 4. təhrif etmək, düz işlətməmək *(sözü və s.)*; 5. yoldan çıxarmaq, başdan çıxarmaq, pis yola çəkmək, pozmaq *(azyaşlıları)*

**abusive** [ə'bju:sıv] *adj* 1. təhqiredici, alçaldıcı; **an ~ letter** təhqiredici məktub; 2. ədəbsiz, nalayiq; **~ language** nalayiq söz, söyüş

**abutment** [ə'bʌtmənt] *n* 1. sərhəd, mərz; 2. dayaq *(xüs. körpüdə)*

**acacia** [ə'keıʃə] *n bot.* akasiya

**academic**[1] [ˌækə'demık] *n* 1. professor, elmi işçi; 2. ali məktəb müəllimi

**academic**[2] [ˌækə'demık] *adj* 1. akademik; **~ hour** akademik saat; **~ year** akademik il, tədris ili; 2. universitet, kollec; **~ dress** universitet/kollec geyimi; 3. nəzəri; **~ subjects** nəzəri fənlər, akademik fənlər

**academician** [əˌkædə'mıʃn] *n* aka'demik

**academy** [ə'kædəmı] *n* 1. akademiya; **the Academy** London İncəsənət Akademiyası; 2. ali məktəb; xüsusi imtiyazı olan özəl orta təhsil müəssisəsi; **a military ~** hərbi məktəb; **an ~ of music** musiqi məktəbi, musiqi akademiyası

**accede** [ək'si:d] *v* 1. razılaşmaq *(əsas. birinci dəfə razılaşmadıqdan sonra)*; bəyənmək; **to ~ to a request /to a proposal** xahişlə /təkliflə razılaşmaq; *In the end she acceded to our request Sonda o bizim xahişimizlə razılaşdı;* 2. qoşulmaq, tərəfdar çıxmaq; **to ~ to a treaty/to a confederacy** müqaviləyə / ittifaqa qoşulmaq; 3. çıxmaq; taxta əyləşmək; **to ~ to the throne** taxta əyləşmək / çıxmaq

**accedence** [æk'si:dəns] *n* 1. başlama *(vəzifəyə)*; 2. qoşulma; 3. razılaşma; razılıq; saziş, müqavilə

**accelerate** [æk'seləreıt] *v* 1. sürətləndirmək, sürətini artırmaq; 2. sürətlənmək, sürəti artmaq

**accelerating** [ək'seləreıtıŋ] *adj* sürətləndirici, sürətləndirən; **~ force** *fiz.* sürətləndirici qüvvə; **~ chamber** *fiz.* sürətləndirici kamera

**acceleration** [ækˌselə'reıʃn] *n* sürətləndirmə; sürətini artırma, sürətləndirilmə; sürətlənmə; **constant ~** daimi sürətlənmə, sürətin daimi artması



**accelerator** [æk'seləreıtəʳ] *n* 1. *tex.* sürətləndirici, sürətləndirici cihaz; **~ pedal** sürət pedalı; 2. *kim.* katalizator

**accelerometer** [ækˌselə'rɔmıtəʳ] *n tex.* akselerometr *(sürətlənməni ölçən cihaz)*

**accent**[1] ['æksənt] *n* 1. vurğu, vurğu işarəsi; **to put the ~ on the first/last syllable** birinci/axırıncı heca üzərinə vurğu işarəsi qoymaq; 2. tələffüz; aksent; **to speak with a foreign ~** xarici /yabançı aksentlə danışmaq; **to speak with a perfect ~** yaxşı/kamil tələffüzlə danışmaq, aksentsiz danışmaq; **to give ~ to *smth.*** bir şeyi vurğulamaq

**accent**[2] [æk'sent] *v* 1. vurğu ilə tələffüz etmək; 2. vurğu qoymaq; 3. vurğulamaq, xüsusilə nəzərə çarpdırmaq

**accentuate** [æk'sentjueıt] *v* 1. vurğulu etmək, vurğulamaq; 2. vurğu işarəsi qoymaq; 3. *poliqr.* mətndə başqa hərflə yazaraq ayırmaq

**accentuation** [ækˌsentju'eıʃn] *n* 1. tələffüz tərzi; 2. ayırma, nəzərə çarpdırma; 3. vurğu qoyma; 4. *poliqr.* başqa hərflə ayırma

**accept** [ək'sept] *v* 1. qəbul etmək, almaq, götürmək; **to ~ an invitation** dəvəti qəbul etmək; **to ~ a present** hədiyyə qəbul etmək/ götürmək / almaq; 2. etiraf etmək, razılaşmaq; **to ~ the fact** faktı qəbul etmək, faktı etiraf etmək

**acceptable** [ək'septəbl] *adj* 1. qəbul edilə bilən, münasib, əlverişli; *The gift is acceptable Hədiyyəni qəbul etmək olar;* 2. faydalı, yararlı; *Your work is not acceptable, do it again Sənin / Sizin işin / işiniz yaramır, onu yenidən gör / görün*

**acceptance** [ək'septəns] *n* 1. qəbul, qəbul edilmə; **~ of an invitation** dəvətin qəbulu, dəvəti qəbuletmə; 2. razılıq, etiraf; **to find ~** razılıq almaq; 3. bəyənmə, təqdir etmə

**accepted** [ək'septıd] *adj* qəbul edilmiş, etiraf olunmuş; **~ definition** qəbul edilmiş tərif; **~ truth** hamıya məlum olan/ hamının qəbul etdiyi həqiqət

**access** ['ækses] *n* 1. yol, giriş; giriş yolu; **~ to world market** dünya bazarına yol / giriş; *The only access to that building is along that muddy track Bu binaya giriş/ yol ancaq o palçıqlı cığırdandır;* 2. keçid; **~ to the island** adaya keçid; **~ to the mountain** dağa yol/keçid; 3. ürəkkeçmə, tutma *(xəstəlikdən, acıqdan və s.)*

**accessibility** [ækˌsesı'bılıtı] *n* 1. mümkünlük, əlverişlilik; 2. *tex.* xidmət və nəzərdən keçirmək üçün rahatlıq

**accessible** [æk'sesəbl] *adj* 1. əldə edilə bilən, tapıla bilən; 2. yolayaxın, təsirə düşən; meylli; **~ to bribery** rüşvətə meylli; 3. *tex.* rahat, əlverişli *(istifadə üçün)*

**accession** [ək'seʃn] *n* 1. yol, giriş; 2. başlama; daxil olma *(vəzifəyə və s.)*; **~ to the throne** taxta çıxma/oturma; 3. qoşulma *(müqaviləyə və s.)*; 4. artma, çoxalma; **the ~ of new members** yeni üzvlərin hesabına artma/çoxalma; 5. *arx.* ürəkkeçmə, tutma *(xəstəlik)*

**accessory** [ək'sesərı] *adj* 1. əlavə, yardımçı, köməkçi; **~ material** əlavə/ yardımçı material; **~ defenses** *hərb.* əlavə müdafiə qurğusu; 2. ikinci dərəcəli

**accidence** ['æksıdəns] *n* 1. *qram.* morfologiya; 2. başlanğıc, əsas

**accident** ['æksıdənt] *n* 1. hadisə, təsadüf; **pure ~** tam təsadüf; **by ~** təsadüfən; 2. bədbəxt hadisə, qəza; **to have/to meet with/an ~** qəzaya uğramaq; **railway/motor ~** dəmiryol / avtomobil qəzası

**accidental** [ˌæksı'dentl] *adj* 1. təsadüfi, gözlənilməz; **~ coincidence** təsadüfi oxşarlıq; **~ discharge** *hərb.* təsadüfi atəş; 2. ikinci dərəcəli, əlavə

**accidentally** [ˌæksı'dentəlı] *adv* təsadüfən, gözlənilmədən

**acclaim**[1] [ə'kleım] *n* sevinclə/səs-küylə qarşılama, bəyənmə nidaları

**acclaim**[2] [ə'kleım] *v* 1. səs-küylə salamlamaq; **to ~ the winner** qalibi hərarətlə qarşılamaq, qalibə hərarətlə əl çalmaq; 2. elan etmək; **to ~ *smb.* (the) winner** bir kəsi qalib elan etmək

**acclamation** [ˌæklə'meıʃn] *n* səs-küylə/hərarətlə bəyənmə; bir şeyi ürəkdən bəyənmə anında işlədilən nidalar; **~s of the multitude** kütlənin hərarətlə alqışlaması; **to hail with ~s** hərarətlə qarşılamaq / alqışlamaq

**acclimatization, -sation** [əˌklaımətaı'zeıʃn] *n* iqlimləşmə, iqlimləşdirmə, iqlimə uyğunlaşma, iqlimə uyğunlaşdırma

**acclimatize, -ise** [ə'klaımətaız] *v* 1. mühitə uyğunlaşdırmaq; uyğunlaşdırmaq; 2. mühitə uyğunlaşmaq; **to ~ oneself to the surroundings** özünü ətraf mühitə uyğunlaşdırmaq

**acclivity** [ə'klıvıtı] *n* az maili yoxuş

**accommodate** [ə'kɔmədeıt] *v* 1. uyğunlaşdırmaq; **to ~ oneself to *smth.*** özünü bir şeyə uyğunlaşdırmaq; 2. öyrəşmək; uyğunlaşmaq; **to ~ oneself to *smb.*** bir kəsə öyrəşmək; 3. yerləşdirmək, yer vermək; **to ~ for the night** bir gecəlik yer vermək; **to be well ~d** yaxşı yerləşmək/ qaydaya düşmək; *The hotel accommodates a hundred guests Bu mehmanxana yüz qonaq tutur, Bu mehmanxanada yüz qonaq yerləşə bilir;* 4. xidmət etmək, kömək göstərmək; **to ~ a client** müştəriyə xidmət etmək; 5. borc vermək; təmin etmək; **to ~ *smb.* with a loan** bir kəsə pul borc vermək; 6. barışdırmaq; yoluna qoymaq, qaydaya salmaq; **to ~ opinions** fikirləri barışdırmaq; **to ~ with *smb.*** bir kəslə barışmaq/razılaşmaq

**accommodating** [ə'kɔmədeıtıŋ] *adj* 1. iltifatlı,

xidmət göstərməyə hazır olan; 2. yolagedən, xoşrəftar, ünsiyyətli, qılıqlı, üzüyola, yolagələn, sözəyatan, sözəbaxan

**accommodation** [ə.kɔmə'deɪʃn] *n* 1. uyğunlaşdırma, düzəltmə; uyğunlaşdırılma, düzəldilmə; uyğunlaşma, öyrəşmə, öyrənmə; 2. yurd, sığınacaq, daldalanacaq yer; otaq, yer, mənzil; **hotel ~** mehmanxana otağı; 3. ordunu yerləşdirmə, yerbəyer etmə *(ordunu)*; 4. *pl amer.* yer *(qatarda, gəmidə və s.)*; 5. rahatlıq, şərait; **a flat with all modern ~s** hər cür müasir şəraiti olan mənzil; **for your ~** sizin rahatlığınız üçün; 6. xidmət, qulluq; **friendly ~** dostcasına xidmət göstərmə; 7. borc

**accompaniment** [ə'kʌmpənɪmənt] *n* 1. müşayiət, müşayiət etmə; 2. *mus.* akkompanement

**accompanist** [ə'kʌmpənɪst] *n* akkompaniator, müşayiətçi, züy tutan *(musiqidə)*

**accompany** [ə'kʌmpənɪ] *v (pt, pp -ied)* 1. müşayiət etmək, birlikdə getmək; yanınca getmək; **to ~ one's explanations with illustrations** izahatını misallarla müşayiət etdirmək /əyani şəkildə izah etmək; 2. *mus.* müşayiət etmək, birlikdə çalmaq, züy tutmaq

**accomplice** [ə'kɔmplɪs] *n hüq.* cinayət yoldaşı

**accomplish** [ə'kɔmplɪʃ] *v* 1. yerinə yetirmək, icra etmək, həyata keçirmək; **to ~ a task/a promise** tapşırığı/vədi yerinə yetirmək; 2. göstərmək, nümayiş etdirmək; **to ~ a feat** igidlik göstərmək; 3. qət etmək, keçmək; **to ~ a distance** məsafə qət etmək

**accomplished** [ə'kɔmplɪʃt] *adj* 1. bitişik; tamamlanmış, başa çatdırılmış; 2. mahir, məharətli, qabil, usta; **an ~ singer** mahir / məharətli/ qabil/kamil müğənni; **an ~ musician** usta /mahir/qabil/kamil musiqiçi

**accomplishment** [ə'kɔmplɪʃmənt] *n* 1. yerinə yetirilmə, həyata keçirmə/keçirilmə; 2. nailiyyət, müvəffəqiyyət; 3. *pl* ləyaqət, məziyyət; yaxşı cəhət; **a man of many ~s** çoxlu məziyyətlərə malik olan adam, kamil / ləyaqətli adam; **inspite of all his ~s** onun bütün məziyyətlərinə baxmayaraq

**accord**[1] [ə'kɔ:d] *n* 1. razılıq; birlik, uyğunluq, harmoniya; **true ~ of hearts** ürəklərin /qəlblərin həqiqi birliyi/razılığı; **to be in ~s, to be in one ~** eyni fikirdə olmaq, razılaşmaq, razılığa gəlmək; **to bring into ~** razılaşdırmaq; uyğunlaşdırmaq; 2. harmoniya, harmonik birləşmə *(rəng və s. haq.)*;

◊ **of its own ~** öz-özünə, öz xoşuna, öz razılığı ilə; **of one's own ~** könüllü, öz istəyi ilə; **with one ~** bir səslə/ağızdan, yekdilliklə, həmrəyliklə

**accord**[2] [ə'kɔ:d] *v* 1. uyğun gəlmək; uyğunlaşmaq; *His conduct and his principles do not well accord Onun hərəkətləri onun prinsipləri ilə uyğun gəlmir;* 2. bağışlamaq, ənam vermək; *He was accorded a warm welcome Onu hərarətlə qarşıladılar;* 3. icazə vermək, razılıq vermək; *She was accorded permission to use the library Ona kitabxanadan istifadə etməyə icazə verdilər;* 4. *arx.* yoluna qoymaq, qaydaya salmaq, həll etmək; **to ~ a difference** ixtilafı həll etmək, ixtilafı yoluna qoymaq / salmaq

accordance [ə'kɔ:dəns] *n* 1. razılıq; həmrəylik; həmahənglik; 2. vermə, təqdim etmə; **the ~ of a privilege** imtiyaz vermə;

◊ **in ~ with** uyğun *(olaraq)*, müvafiq; *In accordance with your orders I sold the boat Sənin/Sizin əmrinizə /əmrinizə müvafiq olaraq mən qayığı satdım*

**accordingly** [ə'kɔ:dɪŋlɪ] *adv* 1. müvafiq olaraq, uyğun olaraq; **to act ~** müvafiq hərəkət etmək; 2. bu yolla, bu qayda ilə; buna görə

**according to** [ə'kɔ:dɪŋtə] *prep* 1. üzrə, görə; **~ rule** qaydaya görə/əsasən, qayda üzrə; **~ his promise** onun vədinə görə; *According to him you are wrong Ona görə sən/siz haqsızsan /haqsızsınız;* 2. müvafiq olaraq; *Each man will be paid according to his ability Hər adama bacarığına müvafiq olaraq əməkhaqqı veriləcək*

**accordion** [ə'kɔ:djən] *n* akkordeon

**accost** [ə'kɔst] *v* 1. müraciət etmək, xitab etmək; 2. dalınca düşmək, əl çəkməmək *(dilənçi haq.)*; sataşmaq, söz atmaq, dalınca düşmək *(xüs. fahişə haq.)*

**account**[1] [ə'kaunt] *n* 1. hesab; **bank ~** bank hesabı; **current ~** cari hesab; **joint ~** ümumi/birgə hesab; **on smb.'s ~** bir kəsin hesabına; **to open an ~ (with)** hesab açmaq *(bankda və s.)*; **to close an ~ (with)** hesabı bağlamaq *(mağazada, bankda və s.)*; **to pay/to settle an ~** hesab vermək, hesabı çürütmək; **to settle/to square ~s with smb.** 1) bir kəslə hesablaşmaq; 2) *məc.* bir kəslə hesablaşmaq, bir kəslə hesabı çürütmək; **to pass/to carry ~** hesaba qoymaq; 2. doklad; hesabat; **to give/to render an ~** hesabat vermək; **an accurate ~ of smth.** bir şey haqqında ətraflı hesabat/doklad; **to call/to bring to ~** hesabat tələb etmək; **to give an ~ of smth.** bir şey haqqında hesabat vermək; bir şey haqqında məlumat vermək; **to give an ~ of one's absence** olmamağının səbəbini izah etmək; 3. rəy, fikir; mülahizə; **according to all ~s, by all ~s** ümumi rəyə/fikrə görə, hamının rəyincə; 4. səbəb; əsas; **on this ~** bu səbəbdən; *On what account? Nə əsasa? Nə səbəbə?* **not on any ~, on no ~** heç bir əsasla, heç bir yolla, heç bir vəchlə; **on smb.'s ~** bir kəsin xatirinə; 5. əhəmiyyət, vaciblik; 6. xeyir, fayda, mənfəət, qazanc; **to find one's ~ in smth.** bir şeydən mənfəət /fayda götürmək, bir şeydən xeyir / fayda görmək;

◊ **the great ~** *din.* haqq-hesab günü, sorğu-sual günü; **to take into ~** nəzərə almaq, hesaba almaq

**account**[2] [ə'kaunt] *v* 1. **(for)** izah etmək; **to ~ for one's being late** gecikməsinin səbəbini izah



etmək; *I cannot account for his behaviour Mən onun hərəkətini izah edə bilmirəm;* 2. hesab etmək; saymaq; etiraf etmək; *I account him a hero Mən onu qəhrəman sayıram/hesab edirəm;* 3. **(for)** hesabat vermək; *He accounted for the money O aldığı pulun hesabatını verdi;* 4. *məc.* hesablaşmaq; *He accounted for five of the enemy O, düşmənlərdən beşi ilə hesablaşdı;* 5. cavab vermək; *He will account for his crime O etdiyi cinayətə görə cavab verəcək*

**accountable** [ə'kauntəbl] *adj* 1. cavabdeh; **to be ~ for one's actions** öz hərəkətinə cavabdeh olmaq; 2. izah edilə bilən, başa salına bilən

**accountancy** [ə'kauntənsɪ] *n* hesabdar işi, hesabdarlıq, mühasibat işi

**accountant** [ə'kauntənt] *n* buxalter; hesabdar, mühasib

**accountant-general** [ə'kauntənt'dʒenərəl] *n* baş buxalter/hesabdar, baş mühasib

**account-book** [ə'kauntbuk] *n* buxalter/ mühasibat kitabı

**accounting** [ə'kauntɪŋ] *n* mühasibat/hesabdar işi;

◊ *There is no accounting for tastes* ≅ *Zövq üstündə mübahisə etməzlər, Hər kəsin öz zövqü var*

**accouterments** [ə'ku:təmənts] *n amer.* = **accoutrements**

**accoutrements** [ə'ku:təmənts] *n* 1. *hərb.* əsgərə lazım olan hər cür şəxsi sursat *(silah və paltardan başqa)*; 2. səyahətçiyə lazım olan hər cür ləvazimat *(fotoaparat, çanta və s.)*

**accredit** [ə'kredɪt] *v* 1. vəkil etmək, vəkalət vermək, səlahiyyət vermək; 2. təyin etmək *(diplomatik nümayəndəni)*; 3. etibar etmək, inanmaq; *I accredited her tale Mən onun hekayətinə inandım;* 4. keyfiyyətə qarantiya vermək

**accreditation** [ə.kredɪ'teɪʃn] *n* vəkil etmə; vəkalət vermə; təqdim etmə *(diplomatik nümayəndəni)*

**accredited** [ə'kredɪtɪd] *adj* 1. vəkil edilmiş, vəkalət verilmiş, vəkalətli; 2. *dipl.* təyin edilmiş

**accretion** [ə'kri:ʃn] *n* 1. artım, artma, çoxalma; **~ of power** hakimiyyətin artması; **~ of territory** ərazinin artması; 2. *biol.* üzvi inkişaf

**accrue** [ə'kru:] *v* artmaq, çoxalmaq, yığılmaq; *If you keep your money in the Savings Bank, interest accrues Əgər pulunu/pulunuzu əmanət kassasında saxlasan / saxlasanız, artar*

**accumulate** [ə'kju:mjuleɪt] *v* 1. yığmaq, toplamaq; **to ~ a large fortune** böyük var-dövlət yığmaq/toplamaq; 2. yığılmaq, toplanmaq, *Dust soon accumulates if the room is not swept Otaq süpürülməsə, tezliklə toz yığılar*

**accumulation** [ə.kju:mju'leɪʃn] *n* 1. yığılma, toplanma; **an ~ of work** işin yığılması *(yəni vaxtında görülməməsi)*; 2. yığım, toplantı; **an ~ of rubbish** zir-zibil yığımı/toplantısı

**accumulative** [ə'kju:mjulətɪv] *adj* yığılan, toplanan; yığılmış, toplanmış

**accumulator** [ə'kju:mjuleɪtər] *n* 1. tamahkar /acgöz adam; 2. *tex.* kompyuterin rəqəmlər saxlanıldığı hissə; 3. *fiz.* akkumulyator *(elektrik enerjisini toplayan cihaz)*

**accuracy** ['ækjurəsɪ] *n* dəqiqlik; düzlük; doğruluq; **~ of a translation** tərcümənin dəqiqliyi; **~ of fire** *hərb.* atəşin dəqiqliyi; *The task was executed with the great possible accuracy Tapşırıq çox dəqiqliklə yerinə yetirildi*

**accurate** ['ækjurɪt] *adj* dəqiq, düz; **~ statement** dəqiq məlumat; **~ translation** dəqiq/düz tərcümə; *Clocks in airport should be accurate Hava limanında / Aeroportda saatlar dəqiq olmalıdır;* **~ fire** *hərb.* dəqiq atəş

**accurately** ['ækjurɪtlɪ] *adv* dəqiq, düz, doğru; səhvsiz; **to speak ~** dəqiq/ səhvsiz danışmaq

**accurateness** ['ækjurɪtnɪs] *n* doğruluq, dəqiqlik; səhvsizlik

**accurse** [ə'kə:s] *v* lənətləmək, lənət yağdırmaq, lənət oxumaq

**accursed** [ə'kə:st] *adj* 1. lənətlənmiş, lənətə gəlmiş, mənhus; 2. mənfur, nifrət / ikrah doğuran /oyadan, iyrənc

**accurse** [ə'kə:s] *adj* = **accursed**

**accusation** [.ækju:'zeɪʃn] *n* 1. ittiham, ittiham etmə/edilmə; **to bring an ~ against smb.** bir kəsə qarşı ittiham irəli sürmək, bir kəsi ittiham etmək; **to be under an ~ of** ittiham olunmaq; 2. *hüq.* ittihamnamə, təqsirnamə

**accusative** [ə'kju:zətɪv] *adj: qram.* **~ case** təsirlik hal *(latın, alman və s. dillərdə)*

**accuse** [ə'kju:z] *v* **(of)** 1. təqsirləndirmək, suçlamaq; müqəssir hesab etmək, günahkar bilmək; 2. *hüq.* ittiham etmək; **to ~ smb. of a crime** bir kəsi cinayətdə ittiham etmək

**accused**[1] [ə'kju:zd] *n hüq.* müttəhim, müqəssir

**accused**[2] [ə'kju:zd] *adj* müqəssir, təqsirkar, suçlu

**accuser** [ə'kju:zər] *n* 1. *hüq.* ittihamçı; 2. şikayətçi

**accustom** [ə'kʌstəm] *v* **(to)** öyrətmək, öyrəşdirmək, alışdırmaq; **to ~ oneself to the cold weather** özünü soyuq havaya öyrətmək / alışdırmaq; **to be ~ed (to)** bir şeyə alışmaq / adət etmək; *He is accustomed to working hard O, ağır işə alışıb*

**ace**[1] [eɪs] *n* 1. xal *(oyunda)*; 2. tuz *(kart oyununda)*; **the ~ of trumps** tuz kozır; 3. as, tuz *(bir işdə yüksək qabiliyyətə, keyfiyyətə malik adam, bir işi çox yaxşı bacaran mütəxəssis)*; 4. tennis oyununda rəqibin topu geri qaytara bilməməsi;

◊ **the ~ of ~s** yaxşıların yaxşısı; **to have an ~ up one's sleeve** əlində ehtiyat kozırı olmaq

**ace**[2] [eɪs] *v* xal qazanmaq *(oyunda)*

**acerb** [ə'sə:b] *adj* turş, büzüşdürücü, dişqamaşdırıcı

**acerbate** ['æsəbeɪt] *v* 1. turşutmaq, turş etmək; 2. qeyzləndirmək, qəzəbləndirmək, hirsləndirmək, acıqlandırmaq

**acerbic** [ə'sə:bɪk] *adj* 1. turş, ağızbüzüşdürən; ağız büzüşdürücü; 2. kəskin, xoşagəlməyən, pis

**acerbity** [ə'sə:bɪtɪ] *n* **1.** turşluq, büzüşdürücülük, ağzı qamaşdırma; **2.** kəskinlik *(xasiyyət, nitq və s. haq.)*
**acetic** [ə'si:tɪk] *adj* **1.** sirkə; ~ **acid** sirkə turşusu
**acetone** ['æsɪtoun] *n kim.* aseton
**acetylene** [ə'setɪli:n] *n kim.* asetilen
**ache**[1] [eɪk] *n* ağrı *(xüs. davamlı)*; **to have an** ~ ağrı hiss etmək; **to give an** ~ ağrı vermək; *I am all aches and pains Mənim hər yerim ağrıyır*
**ache**[2] [eɪk] *v* **1.** ağrımaq; *My head /ear/ tooth aches Mənim başım/qulağım/ dişim ağrıyır; My heart aches Mənim ürəyim ağrıyır; My heart aches at the sight of him Mən onu görəndə ürəyim ağrıyır; I ache all over Mənim hər yerim ağrıyır;* **2.** həsrət çəkmək, çox istəmək, həsrətində olmaq; *She was aching to see you O səni /sizi görmək həsrətində idi, O sənin/sizin həsrətini/ həsrətinizi çəkirdi; She was aching with desire to go O getmək həsrəti ilə yanırdı*
**acheless** ['eɪklɪs] *adj* ağrısız
**achievable** [ə'tʃi:vəbl] *adj* əldə edilə bilən, mümkün olan
**achieve** [ə'tʃi:v] *v* **1.** nail olmaq, əldə etmək, müvəffəq olmaq; **to ~ *one's* purpose/aim** məqsədinə nail olmaq; **2.** müvəffəqiyyətlə yerinə yetirmək; *Our plan was achieved Bizim planımız yerinə yetirildi*
**achievement** [ə'tʃi:vmənt] *n* nailiyyət, müvəffəqiyyət; **the ~s of science** elmin nailiyyətləri; **to be proud of *one's* ~s** öz müvəffəqiyyətləri / nailiyyətləri ilə fəxr etmək
**Achilles' heel** [ə.kɪli:z'hi:l] *n* = **the heel of Achilles** Axillesin dabanı *(bir adamın ən zəif cəhəti/yeri)*
**Achilles tendon** [ə.kɪli:z'tendən] *n* ayağın aşağı hissəsini *(baldırı)* dabana birləşdirən damar
**aching** ['eɪkɪŋ] *adj* ağrıyan, sızıldayan; **an ~ tooth** ağrıyan/sızıldayan diş
**acid**[1] ['æsɪd] *n* **1.** turşuluq; **2.** *kim.* turşu; *Vinegar contains acetic acid Sirkənin tərkibində sirkə turşusu var; Some acids burn holes in wood Bəzi turşular ağacı yandırıb deşik açır*
acid[2] ['æsɪd] *adj* **1.** turş; ~ fruits turş meyvələr; *A lemon is an acid fruit Limon turş meyvədir;* **an ~ taste** turş dad; *Vinegar has an acid taste Sirkənin turş dadı var;* **2.** çılğın, tünd; *(xasiyyət haq.)*; kəskin, iti; **to pass ~ remarks to each other** bir-birinə acı sözlər demək, bir-birini acılamaq; **an ~ wit** iti ağıl; *His remarks were rather acid Onun iradları xeyli kəskin idi*
**acidification** [ə.sɪdɪfɪ'keɪʃn] *n* turşuma, turşutma
**acidify** [ə'sɪdɪfaɪ] *v (pt, pp* **-ied***)* **1.** *kim.* turşuluğunu artırmaq; turşutmaq; turşudulmaq; **2.** turşumaq
**acidity** [ə'sɪdɪtɪ] *n* **1.** turşuluq dərəcəsi, turşuluq; **to suffer from ~ of the stomach** mədə turşuluğundan əziyyət çəkmək; **2.** aşındırıcılıq / yeyicilik qabiliyyəti

**acidulate** [ə'sɪdjuleɪt] *v* turşulaşdırmaq, turşuluğunu artırmaq *(şirniyyatın, içkinin)*
**acidulated** [ə'sɪdjuleɪtɪd] *adj* turşulaşdırılmış, turş dad verilmiş *(içki, şirniyyat və s.)*
**acidulous** [ə'sɪdjuləs] *adj* **1.** turşməzə, turştəhər; **2.** narazı, deyingən, donquldanan
**ack-ack** ['æk'æk] *n hərb.* **1.** zenit topu, təyyarəvuran top; **2.** təyyarə vurmaq üçün açılan top atəşi
**acknowledge** [ək'nɔlɪdʒ] *v* **1.** etiraf etmək, boynuna götürmək; **to ~ *one's* mistakes** öz səhvlərini etiraf etmək / boynuna götürmək; **2.** təsdiq etmək; *He was acknowledged as our leader O bizim rəhbərimiz kimi təsdiq edilmişdir;* **3.** razılıq bildirmək, təşəkkür etmək; **to ~ *smb.'s* kindness** bir kəsə mehribanlıq üçün təşəkkür etmək; **4.** təsdiq etmək; *We must acknowledge his letter Biz onun məktubunu təsdiq etməliyik (ondan məktub aldığımızı etiraf etməliyik)*
**acknowledged** [ək'nɔlɪdʒd] *adj* tanınmış, qəbul edilmiş; mötəbər
**acknowledgement** [ək'nɔlɪdʒmənt] *n* **1.** etiraf, etiraf etmə, tanıma; **2.** təsdiq etmə, razılaşma; **3.** təşəkkür, minnətdarlıq
**acme** ['ækmɪ] *n* yüksək nöqtə, kulminasiya nöqtəsi *(inkişafın, qabiliyyətin və s.)*; **~ of perfection** kamilliyin kuliminasiya nöqtəsi; **to reach the ~ of skill** ustalığın yüksək nöqtəsinə/zirvəsinə çatmaq; **~ of a disease** *arx.* xəstəliyin böhranı *(xəstəliyin ən ağır və təhlükəli vaxtı)*
**acne** ['æknɪ] *n tib.* sızanaq, civzə *(adət. cavanlarda)*
**acolyte** ['ækəlaɪt] *n* **1.** *din.* zəburçu, zəbur oxuyan; **2.** davamçı; köməkçi; **3.** *astr.* peyk
**acorn** ['eɪkɔ:n] *n* palıd qozası
**acoustic** [ə'ku:stɪk] *adj* **1.** akustik; **2.** eşitmə; **~ apparatus** eşitmə cihazı / aparatı
**acoustically** [ə'ku:stɪkəlɪ] *adv* akustikaca, akustika baxımından
**acoustics** [ə'ku:stɪks] *n* **1.** akustika *(fizikanın səsdən bəhs edən hissəsi)*; **2.** *binalarda, xüs. teatrlarda, konsert zallarında və s. səsin yaxşı eşidilməsi üçün tələb olunan şərtlər; The acoustics of the hall are so good that you can hear everything even from the cheapest seats Zalın akustikası elə yaxşıdır ki, hətta ən ucuz yerlərdən də hər şeyi eşitmək olur*
**acquaint** [ə'kweɪnt] *v* **1.** tanış etmək; **to ~ *smb.* with *smth.*** bir kəsi bir şeylə tanış etmək; **2.** tanış olmaq; **to ~ oneself with the situation** vəziyyətlə tanış olmaq; **to be fully ~ed with *smth.*** bir şeylə tam tanış olmaq, bir şey haqqında tam məlumatı olmaq
**acquaintance** [ə'kweɪntəns] *n* **1.** tanışlıq; **~ with a book** kitabla tanışlıq; **to make *smb.'s* ~, to make the ~ of *smb.*, to make ~ with *smb.*** bir kəslə tanış olmaq; **to form a closer ~** yaxından tanış olmaq; **to renew *smb.'s* ~** bir kəslə tanışlığı bərpa etmək; **to drop an ~** tanışlığı kəsmək; **2.** tanış; *She is my acquaintance O mənim tanışımdır*



**acquaintanceship** [ə'kweɪntənsʃɪp] *n* **1.** tanışlıq; **2.** tanış; *He has a wide acquaintanceship among all sorts of people Onun hər cür adamlar arasında çoxlu tanışları var*
**acquainted** [ə'kweɪntɪd] *adj* **1.** tanış *(bir şeylə)*, bilən *(bir şeyi)*; **2.** tanış *(bir kəslə)*, tanıyan *(bir kəsi)*
**acquiesce** [.ækwɪ'es] *v* istəmədən razılaşmaq, könülsüz razılaşmaq
**acquiescence** [.ækwɪ'esəns] *n* könülsüz razılaşma, dinməz razılaşma
**acquiescent** [.ækwɪ'esnt] *n* dinməz-danışmaz / dinməz-söyləməz razılaşan
**acquirable** [ək'waɪərəbl] *adj* əldə edilə bilən, mümkün olan, əlçatan
**acquire** [ə'kwaɪə] *v* əldə etmək, nail olmaq; almaq *(bilik)*, qazanmaq *(vərdiş və s.)*; **to ~ friends** dostlar qazanmaq; **to ~ distinction** ad / san / şöhrət qazanmaq
**acquired** [ə'kwaɪəd] *adj* sonradan qazanılmış; sonradan əldə edilmiş; **~ character/characteristic** *biol.* sonradan qazanılmış xasiyyət; **~ taste** sonradan dərk edilən ləzzət; *Some alcoholic drinks are an acquired taste and are not liked at first Bəzi spirtli içkilər əvvəlcə xoşa gəlmir sonra isə ləzzət verir (yəni onlardan alınan ləzzət sonralar hiss edilir)*
**acquirement** [ə'kwaɪəmənt] *n* **1.** qazanma, əldə etmə *(adət, vərdiş və s.)*; **2.** bilik, bacarıq, vərdiş
**acquisition**[1] [.ækwɪ'zɪʃn] *n* **1.** əldə etmə; ələ keçirmə; **~ of land** torpaq əldə etmə; **2.** nailiyyət; **a valuable ~** qiymətli nailiyyət
**acquisition**[2] [.ækwɪ'zɪʃn] *adj:*~ **department** komplektləşdirmə şöbəsi *(kitabxanada)*
**acquisitive** [ə'kwɪzɪtɪv] *adj* əldə etməyə çalışan; əldə etməyə can atan; **~ mind** elmə can atan adam
**acquisitiveness** [ə'kwɪzɪtɪvnɪs] *n* tamahkarlıq, acgözlük, varlanma cəhdi/ həvəsi
**acquit** [ə'kwɪt] *v* **1.** **(-tt-)** **(of)** təmizə çıxartmaq, bəraət vermək, haqq qazandırmaq; *He was acquitted of the crime Onun cinayətdə əli olmadığını etiraf etdilər; They acquitted him of murder Onlar onun qətldə iştirak etmədiyini etiraf etdilər;* **2.** **(of, from)** azad etmək *(məsuliyyətdən, borcdan və s.)*; **3.** ödəmək, vermək; *(borcu)*; yerinə yetirmək *(vədi)*; **to ~ oneself of a promise** vədini yerinə yetirmək, vədinə əməl etmək; **4.** hesablaşmaq, cavabını vermək, cavab vermək; **to ~ evil for evil** pisliyə pisliklə cavab vermək; **5.** özünü aparmaq, davranmaq; *He acquitted himself rather badly O özünü xeyli pis apardı;* **to ~ oneself well** özünü yaxşı aparmaq, yaxşı davranmaq; **to ~ oneself like a man** özünü kişi kimi aparmaq, kişi kimi davranmaq
**acquittal** [ə'kwɪtl] *n* **1.** bəraət, bəraət qazandırma, təmizə çıxartma *(məhkəmə prosesində)*; **2.** azad etmə *(borcdan, məsuliyyətdən və s.)*; **3.** yerinə yetirmə; həyata keçirmə *(vədi, vəzifəni və s.)*

**acre** ['eɪkə] *n* **1.** akr *(İngiltərədə və Amerikada yer ölçü vahidi: təxminən 4,047 $m^2$)*; **2.** malikanə, torpaq;
◊ **God's Acre** qəbiristan, qəbiristanlıq
**acrid** ['ækrɪd] *adj* **1.** kəskin, tünd *(dad və s.)*; **2.** kəskin, iti *(iy və s.)*; **3.** *məc.* acı, istehzalı, zəhərli *(söz və s.)*
**acridity** [æ'krɪdɪtɪ] *n* **1.** kəskinlik; tündlük; **2.** acıdillik, zəhərlilik
**acridness** ['ækrɪdnɪs] *n* = **acridity**
**acrimonious** [.ækrɪ'mounjəs] *adj* **1.** ətiacı, qanıacı, tünd; diliacı, zəhərləyici; **2.** istehzalı, kinayəli, acı; kəskin; **an ~ quarrel** kəskin mübahisə
**acrimony** ['ækrɪmənɪ] *n* **1.** tündlük, kəskinlik *(xasiyyət haq.)*; **2.** acı, zəhərli *(söz, dil və s.)*; **3.** tündlük, acılıq *(yemək, içmək və s.)*
**acrobat** ['ækrəbæt] *n* akrobat, canbaz
**acrobatic** [.ækrə'bætɪk] *adj* akrobat, canbaz, akrobatik
**acrobatically** [.ækrə'bætɪkəlɪ] *adv* akrobat kimi, canbaz kimi
**acrobatics** [.ækrə'bætɪks] *n* akrobatika, akrobatlıq sənəti, canbazlıq
**acronym** ['ækrənɪm] *n təşkilat adlarının baş hərflərindən düzəldilmiş söz: məs.* **NATO** *(North Atlantic Treaty Organization)*
**across**[1] [ə'krɔs] *adv* **1.** köndələn, köndələninə, eninə; **to lie ~ the bed** çarpayıda köndələn / köndələninə uzanmaq; **a line drawn ~** köndələn/köndələninə çəkilmiş xətt; *A car stood across the road Bir maşın yolda köndələn durmuşdu;* **2.** o taya, o tayda; *When did he come across? O, o taya nə vaxt keçdi? By this time he is across İndi o, o taydadır;* **3.** çal-çarpaz; üst-üstə; *The 2 lines cut across each other İki xətt bir-birini çal-çarpaz kəsir*
**across**[2] [ə'krɔs] *prep* **1.** üstündən; *They built a bridge across the river Onlar çayın üstündən körpü saldılar/tikdilər;* **2.** *Azərbaycan türkcəsində ismin təsirlik hal şəkilçilərinə* **(-i, -ı, -u, -ü; -a, -ə; -ya, -yə)** *uyğun gəlir* : **to swim ~ the river** çayı üzüb keçmək; **to run ~ the road** yolu qaçaraq keçmək; **to slap *smb.* ~ the face** bir kəsin üzünə sillə vurmaq
**act**[1] [ækt] *n* **1.** iş; hərəkət; **~ of kindness** yaxşı iş; **a foolish ~** axmaq iş; **2.** qanun; akt; **Act of Parliament** Parlament qanunu; **~ of the law** hüquqi akt; **3.** *teatr.* pərdə; *The play has three acts Pyes üç pərdədən ibarətdir*
◊ **~ of God** Allah işi; təbii fəlakət
**act**[2] [ækt] *v* **1.** iş görmək; hərəkət etmək; **to ~ immediately** dərhal hərəkət etmək; **to ~ wisely / foolishly** müdrik/axmaq hərəkət etmək; **to ~ on/upon advice** məsləhətə görə/məsləhətə uyğun hərəkət etmək; *Think before you act! Hərəkət etməzdən əvvəl fikirləş!/fikirləşin!;* **2.** işləmək; **to ~ as interpreter** dilmanc işləmək; **3.** *teatr.* ifa etmək, rol oynamaq; **to ~ a part 1)** rol

ifa etmək; 2) *məc.* hiylə/riyakarlıq etmək; yalandan özünü... göstərmək / qoymaq; **to ~ the fool** özünü axmaq yerinə qoymaq; 4. **(on)** təsir etmək; kömək etmək *(dərman)*; *This medicine acts on the heart Bu dərman ürəyə təsir edir; Acids act on metal Turşular metala təsir edir;*

◊ **to ~ as** kimi hərəkət etmək; *A trained dog can act as a guide to a blind man Öyrədilmiş / Təlim görmüş it kor adama bələdçilik edə bilər*

**acting¹** ['æktɪŋ] *n* ifa, ifa etmə, oynama *(rolu: səhnədə və ya filmdə)*

**acting²** ['æktɪŋ] *adj* 1. müvəqqəti vəzifə icra edən; vəzifəsini icra edən; **~ manager** müdir /menicer vəzifəsini müvəqqəti icra edən; 2. fəaliyyət göstərən, hazırda işləyən / vəzifə icra edən; döyüşən; **the ~ President** fəaliyyət göstərən prezident; **~ army** döyüşən ordu

**action** ['ækʃn] *n* 1. hərəkət; fəaliyyət; **in ~** işləyən, fəaliyyət göstərən; qüvvədə olan; **to take ~** 1) hərəkət etməyə başlamaq; 2) ölçü götürmək; **to bring / to put into ~** hərəkətə gətirmək; **to put out of ~** xarab etmək; sıradan çıxartmaq; *The storm put the telephones out of action Tufan telefonları sıradan çıxardı /xarab etdi; Time has come for action Hərəkət etmək vaxtı gəlib/çatıb; Action! Başladıq! (hərəkətə başlamaq üçün komanda)*; **~ of the bowels** bağırsaqların fəaliyyəti; **physical ~** fiziki fəaliyyət; **~ of the heart** ürəyin fəaliyyəti; **mental ~** əqli fəaliyyət; **noble ~** alicənab hərəkət; **to be responsible for** ***one's*** **~s** öz hərəkətlərinə görə məsuliyyət daşımaq; **to suit the ~ to the word** hərəkətini sözünə uyğunlaşdırmaq; **collective ~** birgə/kollektiv hərəkət; 2. təsir, təsir etmə; **the ~ of a drug / of sunlight** dərmanın / günəş şüasının təsiri; 3. süjet, hadisə *(pyesdə, romanda və s.)*; **the development of the ~** süjetin inkişafı; **unity of ~** hərəkətin vəhdəti; 4. iş, məsələ; *hüq.* **to bring/to enter an ~ against** ***smb.*****, to take ~ against** ***smb.*** bir kəsə qarşı iş qaldırmaq *(məhkəmə yolu ilə)*; 5. *hərb.* döyüş, döyüşmə, vuruşma; **to bring / to put into ~** döyüşə başlamaq; **to go into ~** döyüşə girmək; **to come out of ~** 1) vuruşdan əl çəkmək; 2) sıradan çıxmaq; **to be killed/to fall in ~** döyüşdə / vuruşda həlak olmaq; 6. *tex.* mexanizm;

◊ *Actions speak louder than words at. söz.* ≅ *Adamı sözünə görə deyil hərəkəti ilə tanıyırlar, Hərəkət sözdən tutarlıdır*

**activate** ['æktɪveɪt] *v* 1. fəallaşdırmaq, fəaliyyətini artırmaq / yüksəltmək; 2. *fiz.* ionlaşdırmaq; radioaktivləşdirmək; 3. *amer. hərb.* ordu hissəsinə götürmək; ordu bölüyü təşkil etmək

**activated** ['æktɪveɪtɪd] *adj kim.* aktivləşdirilmiş; **~ carbon** aktivləşdirilmiş kömür

**activation** [ˌæktɪ'veɪʃn] *n xüs.* fəallaşdırma, fəallaşma; aktivləşdirmə, aktivləşmə

**activator** ['æktɪveɪtəʳ] *n kim.* aktivator *(fermentlərin təsirini gücləndirən kimyəvi maddə)*

**active¹** ['æktɪv] *n*: ***(the)*** **~ voice** felin məlum növü; *Put this sentence into the active Bu cümləni məlum növə çevir/çevirin*

**active²** ['æktɪv] *adj* 1. fəal; fəaliyyətli, cəld, çalışqan, səyli; diri, diribaş, çevik, zirək, qıvraq; **an ~ child** diribaş/çevik / zirək uşaq; **to be ~ for** ***one's*** **age** yaşına görə zirək / diribaş /çevik olmaq; **to become ~** fəallaşmaq, çevikləşmək, zirəkləşmək; **as ~ as a cat** pişik kimi cəld / çevik; 2. təsirli, əsl; həqiqi; **~ help** əsl /təsirli/həqiqi kömək; 3. təsir qüvvəsi olan, təsir edən; **~ laws** təsir qüvvəsi olan / istifadədə olan qanunlar; 4. *hərb.* həqiqi; **~ forces** həqiqi ordu; **~ service** həqiqi xidmət *(orduda)*; 5. radioaktiv xassəyə malik olan; *Be careful! That dangerous chemical is still active Ehtiyatlı olun! Bu kimyəvi maddə hələ aktivdir (yəni özündən radioaktiv şüalar buraxır)*

**actively** ['æktɪvlɪ] *adv* fəal, fəal surətdə, diribaş, cəld

**activist** ['æktɪvɪst] *n* aktivist, fəal *(ictimai təşkilatın fəal üzvü)*

**activity** [æk'tɪvɪtɪ] *n* 1. fəaliyyət, iş; **literary activities** ədəbi fəaliyyət; *His activities were much criticized Onun işini möhkəm tənqid etdilər*; 2. fəallıq, aktivlik, çalışqanlıq

**activize** ['æktɪvaɪz] *v* aktivləşdirmək, fəallaşdırmaq

**actor** ['æktəʳ] *n* 1. aktyor; **celebrated/renowned ~** tanınmış/məşhur/şöhrətli aktyor; 2. xadim; iştirak edən şəxs, iş görən adam

**actress** ['æktrɪs] *n* aktrisa

**actual** ['æktʃuəl] *adj* 1. mövcud olan, həqiqi; əsl, real; **in ~ fact** həqiqətən, həqiqətdə; **~ amount** həqiqi miqdar; 2. cari, hazırkı; **~ position of affairs** işlərin mövcud/hazırki vəziyyəti; **~ president** hazırkı prezident, fəaliyyətdə olan prezident

**actuality** [ˌæktʃu'ælɪtɪ] *n* 1. gerçəklik, varlıq; 2. fakt, həqiqət, mövcud olan şey

**actualize, -ise** ['æktʃuəlaɪz] *v* 1. reallaşdırmaq, həyata keçirmək; 2. realistcəsinə təsvir etmək

**actually** ['æktʃuəlɪ] *adv* 1. əslində, faktiki olaraq; *You are actually the only friend I have Sən/Siz əslində mənim yeganə dostumsan/dostumsunuz*; 2. hazırda; *Which is the political group actually in power? Hazırda hansı siyasi qrup hakimiyyətdədir?*

**actuary** ['æktʃuərɪ] *n* katib, registrator, qeydçi

**actuate** ['æktʃueɪt] *v* 1. hərəkətə gətirmək; 2. vadar /təhrik etmək, həvəs oyatmaq; *What motives actuated him? Onu hansı motivlər hərəkətə gətirdi?*

**acuity** [ə'kju:ɪtɪ] *n* itilik, kəskinlik *(görmə, ağıl və s. haq.)*; **~ of vision** görmə qabiliyyətinin itiliyi / kəskinliyi

**acumen** [ə'kju:mən] *n* fərasət, zəka, zirəklik, tez başa düşmə



**acupuncture** [ˌækju'pʌŋktʃəʳ] *n tib.* iynə batırmaqla müalicə *(xüs. Çində istifadə edilən müalicə metodu və vasitəsi)*

**acute** [ə'kju:t] *adj* **(-r, -st)** 1. iti, sivri; **~ angle** iti bucaq; **~ mind** iti ağıl /zəka; 2. həssas; fərasətli, ağıllı, açıqgözlü; **~ observer** həssas müşahidəçi; **an ~ man** ağıllı / fərasətli adam; 3. kəskin, güclü, qızğın *(hissiyat haq.)*; **~ pain** kəskin ağrı; **~ jealousy** qızğın/kəskin qısqanclıq; 4. *tib.* ağır, kəskin, şiddətli; **~ gastritis** şiddətli /ağır / kəskin qastrit

**acutely** [ə'kju:tlɪ] *adv* kəskin, iti, kəskin surətdə, çox kəskin tərzdə

**acuteness** [ə'kju:tnɪs] *n* kəskinlik; itilik

**AD** ['eɪ'di:] *n* **in the year since the birth of Christ** *(İsa peyğəmbərin doğumundan sonra ifadəsinin qısa forması)* bizim erada / eramızda

**ad** [æd] *n* **advertisement** *isminin qısa forması*

**adage** ['ædɪdʒ] *n (qədim)* müdrik atalar sözü

**adagio** [ə'da:dʒɪou] *n mus.* adajio;

◊ **~ skating** *id.* konkidə klassik rəqs

**Adam** ['ædəm] *n* Adəm *(Bibliyaya görə Allahın yaratdığı ilk adam / insan)*

**adamant¹** ['ædəmənt] *n* 1. çox bərk mineral və ya metal; 2. möhkəm, dəmir; **will of ~** dəmir/ möhkəm iradə; 3. *arx.* almaz; brilliant

**adamant²** ['ædəmənt] *adj* mətanətli, möhkəm, dayanıqlı, fikrindən dönməyən, sarsılmaz, yenilməz; **to be ~** yenilməz /mətanətli /sarsılmaz olmaq

**Adam's apple** ['ædəmz'æpl] *n anat.* hülqum, xirtdək

**Adam's-needle** ['ædəmz'ni:dl] *n bot.* lifli yuka *(zanbaq fəsiləsindən olan bitki)*

**adapt** [ə'dæpt] *v* 1. uyğunlaşdırmaq, düzəltmək, lazımi vəziyyətə salmaq; **to ~ a plan to suit the new circumstance** planı yeni şəraitə uyğunlaşdırmaq; **to ~ oneself to/for** uyğunlaşmaq, özünü uyğunlaşdırmaq / öyrətmək, özünü öyrəşdirmək; 2. asanlaşdırmaq, uyğunlaşdırmaq, adaptə etmək; *(mətni, kitabı və s.)*; **to ~ a book for use in schools** kitabı orta məktəblərdə istifadə etmək üçün asanlaşdırmaq

**adaptability** [ə.dæptə'bɪlɪtɪ] *n* uyğunlaşdırılma qabiliyyəti, uyğunlaşma qabiliyyəti

**adaptable** [ə'dæptəbl] *adj* asan uyğunlaşan, uyğunlaşdırıla/asanlaşdırıla bilən; *He is very adaptable O, şəraitə asanlıqla uyğunlaşır / alışır*

**adaptation** [ˌædəp'teɪʃn] *n* 1. uyğunlaşdırma; uyğunlaşma; 2. yenidən işlənmə; **~ of a novel** romanın səhnələşdirilməsi; 3. *biol.* mühitə uyğunlaşma, adaptasiya

**adaptator** [ˌædəp'teɪtəʳ] *n* uyğunlaşdıran, ədəbi əsəri ekran üçün işləyən müəllif, kinossenarist

**adapted** [ə'dæptɪd] *adj* uyğunlaşdırılmış; asanlaşdırılmış; **an ~ text** asanlaşdırılmış mətn; **~ stories** asanlaşdırılmış hekayələr

**A-day** ['eɪ'deɪ] *n* 1. birinci atom bombasının sınaqdan keçirildiyi gün; 2. mümkün ola bilən atom hücumu günü

**add** [æd] *v* 1. **(to)** əlavə etmək; **to ~ some wood to fire** ocağa bir az odun əlavə etmək; *She added some wood to increase the fire Qızışdırmaq üçün o, ocağa bir az odun əlavə etdi; I should like to add that we are pleased with the result Mən onu da əlavə etmək istərdim ki, biz nəticədən razıyıq*; 2. *riyaz.* **(to, together)** gəlmək, toplamaq; *If you add 5 to 3, you get 8 Əgər sən/siz 5-in üstünə 3 gəlsən/gəlsəniz, 8 olar;*

◊ **to ~ insult to injury** yara üstündən yara vurmaq; **to ~ fuel to the fire** ocağa yağ tökmək *(yəni aranı qızışdırmaq)*

**addendum** [ə'dendəm] *n* əlavə *(kitaba, müqaviləyə və s.)*

**adder** ['ædəʳ] *n zool.* 1. gürzə; 2. *amer.* suilanı

**addict¹** ['ædɪkt] *n* narkoman *(narkotiklərə mübtəla olan adam)*; aludə; *He is a TV addict O, televizor aludəsidir, Onu televizordan ayırmaq olmur*

**addict²** [ə'dɪkt] *v* 1. uymaq, qurşanmaq, aludə olmaq; **to ~ oneself to** ***smth.*** bir şeyə uymaq; **to ~ oneself to drink** içkiyə qurşanmaq; 2. **(to)** həsr etmək; **to ~** ***one's*** **mind to business** ancaq biznes haqqında düşünmək, fikri-zikri biznes haqqında düşünmək olmaq

**addicted** [ə'dɪktɪd] *adj* meylli, həvəsli; **~ to drink** içkiyə meylli

**addiction** [ə'dɪkʃn] *n* 1. həvəs, meyl, zərərli vərdiş; 2. narkomaniya

**addition** [ə'dɪʃn] *n* 1. əlavə, əlavə etmə; **in ~ to it** əlavə olaraq, buna əlavə olaraq; 2. *riyaz.* üstəgəlmə, toplama; 3. *kim.* qatışıq, aşqar

**additional** [ə'dɪʃənl] *adj* əlavə; **~ charges** əlavə xərclər

**additionally** [ə'dɪʃnəlɪ] *adv* əlavə olaraq; bundan əlavə

**addle** ['ædl] *v* 1. xarab etmək/olmaq; **to ~ an egg** yumurtanı xarab etmək; 2. dolaşdırmaq, qarışdırmaq; **to ~** ***one's*** **brain /head** beynini/başını qarışdırmaq, başını doldurmaq *(mənfi mənada)*

**addled** ['ædld] *adj* xarab olmuş, lax; **an ~ egg** lax yumurta

**addle-brain** ['ædlbreɪn] *n* başıboş, gic, qanmaz, axmaq *(adam)*

**addle-brained** ['ædl'breɪnd] *adj* 1. başsız, beyinsiz, başıboş, gic, qanmaz; 2. dəli, ağıldankəm

**addle-head** ['ædlhed] *n* = **addle-brain**

**addle-headed** ['ædl'hedɪd] *adj* = **addle-brained**

**address¹** [ə'dres] *n* 1. ünvan, adres; **to change** ***one's*** **~** ünvanı dəyişmək, köçmək; 2. müraciət, xitab; nitq; **opening ~** giriş nitqi; **formal ~** rəsmi çıxış; **to give / to deliver an ~** nitq söyləmək; 3. danışıq tərzi; 4. *pl* qadınlara pərəstişkarlıq etmə / göstərmə; **to pay** ***one's*** **~es to a lady** qadına pərəstişkarlıq etmək

**address²** [ə'dres] *v* 1. göndərmək, ünvana gön-

dərmək/yollamaq; **to ~ a letter to *smb.*** bir kəsə məktub göndərmək; məktubun üstünə ünvan/adres yazmaq; **2.** xitab/müraciət etmək; *Were your words addressed to me? Sənin/Sizin sözün/sözləriniz mənim ünvanımadır?, Sən/Siz mənə müraciət edirsən/edirsiniz?;* **3.** çıxış etmək *(iclasda)*; **to ~ a meeting** iclasda çıxış etmək, iclasa müraciət etmək

**addressed** [ə'drest] *adj* ünvanlanmış, göndərilmiş; ünvan / adres yazılmış

**addressee** [ˌædre'si:] *n* adresat, ünvan sahibi

**adduce** [ə'dju:s] *v* gətirmək, göstərmək *(sitat, sübut); Can you adduce any reason? Sən/ Siz səbəb göstərə bilərsənmi? / bilərsinizmi?*

**adenoids** [ˌædɪnɔɪdz] *n tib.* adenoid *(udlaq badamcıqlarının şişməsi)*

**adequacy** ['ædɪkwəsɪ] *n* **1.** uyğunluq, müvafiqlik, eynilik, adekvatlıq; **2.** kafilik; **3.** səlahiyyət; səriştəlilik

**adequate** ['ædɪkwɪt] *adj* **1.** lazımi qədər, kifayət qədər; kifayət; *We took adequate food for the short holiday Biz qısa istirahət üçün lazımi qədər ərzaq götürdük; Thousand manats is not adequate to support a family Min manat ailə saxlamaq üçün kifayət deyil;* **2.** müvafiq; səriştəli, mötəbər, etibarlı; *He is an adequate man for your job O sənin / sizin işin / işiniz üçün səriştəli adamdır*

**adequately** ['ædɪkwɪtlɪ] *adv* **1.** lazımınca, kifayət qədər; **2.** adekvat, tam uyğun; müvafiq olaraq, müvafiq surətdə; **3.** səlahiyyətlə

**adhere** [əd'hɪəʳ] *v* **(to) 1.** yapışmaq; *Mud adhered to our shoes Palçıq bizim ayaqqabılarımıza yapışdı;* **2.** əməl etmək, sadiq qalmaq *(əqidəyə, görüşə və s.)*; **to ~ to a decision** qərara əməl etmək, qərarı yerinə yetirmək

**adherence** [əd'hɪərəns] *n* **1.** sədaqət, bağlılıq, vəfa; **~ to a cause** bir işə sədaqət / bağlılıq; **2.** qəti olaraq riayət etmə *(qaydaya, göstərişə və s.)*; **~ to specification** texniki göstərişə / şərtə qəti əməl etmə

**adherent**[1] [əd'hɪərənt] *n* tərəfdar, ardıcıl

**adherent**[2] [əd'hɪərənt] *adj* yapışqan, suvaşqan, yapışqanlı, yapışan

**adhesion** [əd'hi:ʒn] *n* **1.** yapışma; **2.** sadiqlik, bağlılıq *(qaydaya, prinsipə və s.)*

**adhesive**[1] [əd'hi:sɪv] *n* yapışqan, yapışqan maddə

**adhesive**[2] [əd'hi:sɪv] *adj* yapışqan, suvaşqan, yapışqanlı; **~ plaster** yapışqan plastır; **~ power** *tex.* ilişmə gücü; **~ capacity** *tex.* ilişmə əmsalı

**adhesiveness** [əd'hi:sɪvnɪs] *n* yapışqanlıq, yapışma / ilişmə qabiliyyəti

**adieu** [ə'dju:] *n* xudahafizləşmə, sağollaşma; **to make/to take *one's* ~, to bid/to say ~ to *smb.*** bir kəslə xudahafizləşmək

**adinfinitum** [ˌædɪnfɪ'naɪtəm] *adj lat.* sonsuz, nəhayətsiz; həmişəlik

**adipose**[1] ['ædɪpous] *n* heyvan yağı / piyi

**adipose**[2] ['ædɪpous] *adj* yağlı, piyli

**adiposity** [ˌædɪ'pɔsɪtɪ] *n* piylənmə, piy basma; həddən artıq kökəlmə

**adjacent** [ə'dʒeɪsənt] *adj* yanında olan, yanaşı olan, bitişik olan, qonşu; **~ villages** bitişik/qonşu kəndlər; **~ angles** *riyaz.* qonşu bucaqlar; *The 2 families live in adjacent streets Bu iki ailə qonşu küçələrdə yaşayır*

**adjacently** [ə'dʒeɪsəntlɪ] *adv* qonşuluqda, yanyana

**adjectival** [ˌædʒek'taɪvəl] *adj* sifəti, sifət kimi işlənən / işlənə bilən; **an ~ pronoun** sifəti əvəzlik; **an ~ phrase** sifət kimi / sifət funksiyasında işlənə bilən ifadə

**adjoin** [ə'dʒɔɪn] *v* **1.** yanaşı olmaq, qonşu olmaq, bitişik olmaq; *The two houses adjoin Bu iki ev bitişikdir; The playing-field adjoins the school Oyun meydançası məktəbə bitişikdir/yaxındır;* **2.** *arx.* birləşdirmək

**adjoining** [ə'dʒɔɪnɪŋ] *adj* **1.** qonşu; yanaşı olan; **2.** *qram.* yanaşma

**adjourn** [ə'dʒə:n] *v* **1.** təxirə salmaq; **to ~ a meeting / a journey, *etc.*** iclası / səyahəti *və s.* təxirə salmaq; **2.** fasilə elan etmək; *Parliament adjourned at five o'clock Saat beşdə Parlamentin iclası təxirə salındı;* **3.** keçmək, getmək *(başqa yerə xüsusən istirahət üçün)*; **to ~ to the sitting-room** *d.d.* qonaq otağına keçmək; *We finished dinner and adjourned to the garden Biz naharı qurtarıb bağa getdik / keçdik*

**adjournment** [ə'dʒə:nmənt] *n* **1.** təxir, təxirə salma *(iclası və s.)*; **2.** fasilə *(iclasda və s.)*; *The court met again after an adjournment of 2 weeks İki həftəlik fasilədən sonra məhkəmə yenidən işə başladı*

**adjudge** [ə'dʒʌdʒ] *v* **1.** qərar çıxarmaq / vermək, hökm çıxarmaq; **to ~ *smb.* to be guilty** bir kəsi günahkar hesab etmək, bir kəsin günahkar olması haqda hökm çıxartmaq; **to ~ *smb.* to beggary** bir kəsi dilənçiliyə düçar etmək, bir kəsi dilənçi vəziyyətinə salmaq; **2.** vermək *(mükafat, müavinət, kompensasiya və s.)*, hökm çıxarmaq / vermək; *The court adjudged the dead man's house to his son Məhkəmə ölən kişinin evinin onun oğluna verilməsi haqqında hökm çıxardı*

**adjudgement** [ə'dʒʌdʒmənt] *n* **1.** məhkəmə qərarı; hökm çıxarma; **2.** kəsmə, kəsilmə *(məhkəmənin qərarı ilə)*

**adjudicate** [ə'dʒu:dɪkeɪt] *v* **1. (on, upon)** mühakimə etmək, işə baxmaq, iş kəsmək *(məhkəmədə)*; hakimlik etmək, qərar çıxarmaq / vermək; **to ~ on a matter** hər hansı bir məsələ üzrə qərar çıxarmaq; **2.** işi / mübahisəni həll etmək

**adjudication** [əˌdʒu:dɪ'keɪʃn] *n* **1.** məhkəmə qərarı/hökmü; **2.** qərar çıxarma, hökm vermə

**adjudicator** [ə'dʒu:dɪkeɪtəʳ] *n* münsiflər hakimi

**adjunct** ['ædʒʌŋkt] *n* **1.** əlavə, əlavə etmə; **2.** köməkçi; adyutant; **2.** *qram.* təyin; zərflik



**adjunction** [ə'dʒʌŋkʃn] *n* əlavə, əlavə etmə; artırma, tamamlama; qoşma, qoşulma; qatılma, qatma, əlavə olunma

**adjuration** [ˌædʒuə'reɪʃn] *n* **1.** yalvarış, yalvarma; **2.** and, and içmə; *hüq.* and içdirmə

**adjure** [ə'dʒuəʳ] *v* yalvarmaq, and vermək; *She adjured him to tell the truth O, yalvardı/and verdi ki, o, həqiqəti danışsın*

**adjust** [ə'dʒʌst] *v* **1.** nizamlamaq, nizama salmaq; qaydaya salmaq, yoluna qoymaq, düzəltmək, həll etmək *(mübahisəni və s.)*; *I must adjust my watch, it is slow Mən saatımı düzəltməliyəm, o, geri qalır;* **2.** uyğunlaşmaq, uyğunlaşdırmaq; *He adjusted himself very quickly to the heat O, istiyə çox tez uyğunlaşdı, O özünü istiyə tez alışdırdı*

**adjustable** [ə'dʒʌstəbl] *adj* tənzim edilən, nizamlaşdırılan; **~ spanner** açılan/ tənzim edilən açar *(alət)*, qayka açarı

**adjuster** [ə'dʒʌstəʳ] *n* **1.** quraşdırıcı, montajçı; **2.** quraşdırıcı qurğu

**adjusting** [ə'dʒʌstɪŋ] *adj tex.* quraşdırma; **an ~ shop** quraşdırıcı sex / emalatxana

**adjustment** [ə'dʒʌstmənt] *n* **1.** tənzimləmə, uzlaşdırma, tənzim etmə; **to make ~ to** uyğunlaşmaq, uyğunlaşdırmaq, öyrəşmək, öyrəşdirmək; **2.** qaydaya salma, idarə etmə; **3.** kökləmə *(musiqi alətini)*; **4.** *tex.* qurğu, mexanizm; **5.** alma *(nişan)*; **~ of sight** nişan alma; **6.** *tib.* qoyma; **~ of dressing** sarğı qoyma

**adjutant** ['ædʒutənt] *n hərb.* adyutant

**ad-lib** [ˌæd'lɪb] *adv* **1.** hüdudsuz, sərbəst, istənilən qədər; **to eat ~** istənilən qədər yemək; **2.** spontan, hazırlıqsız, bədahətən; *The best joke in the play was ad-lib Pyesdə ən yaxşı zarafat spontan deyilən idi*

**adman** ['ædmæn] *n* reklam agentliyində işləyən adam, reklamçı, reklam müvəkkili

**admass** ['ædmæs] *n d.d.* sadəlövh kütlə, reklama / təbliğata tez inanan adamlar

**administer** [əd'mɪnɪstəʳ] *v* **1.** idarə etmək, aparmaq; **to ~ *smb.'s* affairs** bir kəsin işini idarə etmək / aparmaq; **to ~ the affairs of the state** dövləti idarə etmək, dövlət işləri aparmaq; **2.** kömək etmək; təmin etmək; ehtiyacını ödəmək; **to ~ to *smb.'s* needs** bir kəsin ehtiyacını ödəmək; **3.** tətbiq etmək; **to ~ punishment** cəza tətbiq etmək; **4.** endirmək, vurmaq; **to ~ a blow to smb/smth** bir kəsə/bir şeyə zərbə endirmək/vurmaq; **5.** təyin etmək, yazmaq *(dərman)*; *The doctor administered the medicine to the sick woman Həkim xəstə qadına dərman yazdı*

**administration** [ədˌmɪnɪs'treɪʃn] *n* **1.** idarə; müdiriyyət; **military ~** hərbi idarə; **2.** hökumət; **last ~** axırıncı hökumət; **3.** nazirlik; **4.** təmin etmə; kömək göstərmə

**administrative** [əd'mɪnɪstrətɪv] *adj* **1.** inzibati; **~ duties** inzibati vəzifələr; **~ responsibility** inzibati məsuliyyət; **2.** icra, icraedici; **3.** *hərb.* arxa; cəbhəarxası; **~ link** cəbhəarxası əlaqə; **~ troops** cəbhəarxası qoşun hissələri

**administrator** [əd'mɪnɪstreɪtəʳ] *n* **1.** administrator, müdir, idarə başçısı; **2.** *hüq.* qəyyum, vəsi

**admirable** ['ædmərəbl] *adj* çox gözəl, çox yaxşı, çox qəşəng; əla; **an ~ meal** əla yemək

**admiral** ['ædmərəl] *n* **1.** admiral; **A. of the Fleet** donanma admiralı; **2.** flaqman gəmisi; ◊ **~ of the blue** meyxanaçı, meyxana sahibi; **~ of the red** əyyaş, içki düşkünü

**admirality** ['ædmərəltɪ] *n* **1.** admirallıq; hərbidəniz nazirliyi *(İngiltərədə)*; **2.** admiral rütbəsi

**admiration** [ˌædmə'reɪʃn] *n* **1.** məftunluq; heyranlıq; heyran olma, heyran qalma, valeh olma; **profound /sincere ~** dərin / əsl məftunluq; **to excite general ~** ümumi heyranlıq yaratmaq; **2.** sitayiş, sitayiş etmə, pərəstiş etmə; məftun olma; *She was admiration of all the young men Bütün cavan oğlanlar ona pərəstiş edirdilər, Bütün cavanlar ona məftun idilər*

**admire** [əd'maɪəʳ] *v* heyran/valeh/məftun olmaq; baxıb zövq/həzz almaq; **to ~ *smb.*** bir kəsə heyran/məftun/valeh olmaq; *I admire him for his courage Mən onun cəsarətinə heyranam/valeham / vurğunam*

**admirer** [əd'maɪərəʳ] *n* **1.** pərəstişkar, aşiq; *He is one of his sister's admirers O onun bacısının pərəstişkarlarından biridir;* **2.** həvəskar; vurğun; **an ~ of music** musiqi həvəskarı / musiqi vurğunu

**admissible** [əd'mɪsɪbl] *adj* yol verilən, mümkün ola bilən; münasib, qəbul oluna bilən, məqbul

**admission** [əd'mɪʃn] *n* **1.** yol, giriş; *Admission free Giriş azaddır; Admission by ticket Giriş biletlədir;* **2.** qəbul, daxil olma; *Admission to the school is by examination Məktəbə qəbul imtahanladır;* **3.** boynuna alma, etiraf etmə; etiraf; **~ of guilt** günahı etiraf etmə, təqsiri/ suçu boynuna alma

**admit** [əd'mɪt] *v (-tt-)* **1.** qəbul etmək; ehtimal /fərz etmək, mümkün hesab etmək; **to ~ a hypothesis** fərziyyəni qəbul/mümkün hesab etmək; **to ~ the truth of the story** hekayənin doğruluğunu qəbul etmək; **2.** boynuna almaq, etiraf etmək; *The thief admitted his crime Oğru öz cinayətini etiraf etdi/boynuna aldı; I admit that it was difficult Mən etiraf edirəm ki, o, çətin idi;* **3.** tutmaq; yeri olmaq; *The hall admits only 200 people Zal ancaq 200 adam tutur;* **4.** buraxmaq, qəbul etmək; **to ~ *smb.* into the house** bir kəsi evə buraxmaq; **to ~ into school** məktəbə qəbul etmək; *Children are not admitted Uşaqlar buraxılmır;* **5. (of)** yaratmaq, oyatmaq; *It does not admit of doubt Bu, şübhə yaratmır / oyatmır / doğurmur*

**admittance** [əd'mɪtəns] *n* giriş; *No admittance Giriş qadağandır, Giriş yoxdur*

**admitted** [əd'mɪtɪd] *adj* qəbul olunmuş; hamıya məlum olan, hamının qəbul etdiyi; ~ **fact** hamının qəbul etdiyi fakt, hamıya məlum olan fakt; *He is an admitted thief O hamıya məlum olan oğrudur*
**admittedly** [əd'mɪtɪdlɪ] *adv* hamının qəbul/etiraf etdiyi kimi; *Admittedly, he is a thief Etiraf etmək lazımdır ki, o, oğrudur*
**admixture** [əd'mɪkstʃəʳ] *n* **1.** qarışdırma, **2.** qatışıq, qarışıq; aşqar
**admonish** [əd'mɔnɪʃ] *v* **1.** öyüd-nəsihət vermək, düz yola çağırmaq; **2.** xəbərdarlıq etmək, qabaqcadan xəbərdar etmək; *The teacher admonished the boys against being late Müəllim xəbərdarlıq etdi ki, oğlanlar dərsə gecikməsinlər;* **3.** inandırmaq; **to ~ smb. to do smth.** bir kəsi bir iş görməyə inandırmaq
**admonishment** [əd'mɔnɪʃmənt] *n* **1.** öyüd, nəsihət; nəsihət/öyüd vermə; **2.** təlimat; sakındırma, çəkindirmə
**admonition** [,ædmə'nɪʃn] *n* **1.** xəbərdarlıq; saqındırma, çəkindirmə; məsləhət; **2.** məzəmmət; göstəriş
**admonitory** [əd'mɔnɪtərɪ] *n* **1.** saqındırıcı, xəbərdaredici; öyüdverici, nəsihətverici; ~ **remarks** nəsihətverici / saqındırıcı məzəmmətlər
**ado** [ə'du:] *n* **1.** təlaş, vurnuxma, çapalama, boş-boşuna ora-bura qaçma; çaxnaşma, qarışıqlıq, mərəkə, vəlvələ, səs-küy; **to make much ~ about smth.** bir şey barədə çaxnaşma salmaq; **much ~ about nothing** heç nədən çaxnaşma / vəlvələ/ səs-küy; **2.** çətinlik, qayğı, zəhmət; başağrısı; **to have much ~** böyük çətinlik çəkmək
**adobe** [ə'doubɪ] *n tik.* **1.** ayıbalası, çiy kərpic; **2.** ayıbalasından tikilmiş tikinti / bina
**adolescence** [,ædou'lesns] *n* gənclik, cavanlıq
**adolescent**[1] [,ædou'lesnt] *n* gənc, yeniyetmə *(qız, oğlan)*
**adolescent**[2] [,ædou'lesnt] *adj* gənclik, cavanlıq
**adopt** [ə'dɔpt] *v* **1.** övladlığa götürmək; **to ~ a child** uşağı övladlığa götürmək; **2.** qəbul etmək, əxz etmək, mənimsəmək; **to ~ smb.'s ideas** bir kəsin ideyalarını qəbul etmək/mənimsəmək; *His methods should be adopted Onun metodları qəbul edilməlidir;* **3.** rəsmi olaraq bəyənmək, qəbul etmək; *The committee adopted his suggestions Komitə onun təkliflərini bəyəndi/qəbul etdi;* **4.** *dilç.* almaq, götürmək
**adopted** [ə'dɔptɪd] *adj* **1.** övladlığa götürülmüş; **an ~ child** övladlığa götürülmüş uşaq; **2.** mənimsənilmiş, əxz edilmiş/olunmuş; **3.** *dilç.* alınmış, alınma; ~ **words** alınma sözlər
**adoption** [ə'dɔpʃn] *n* **1.** övladlığa götürmə; **2.** qəbul edilmə / etmə, qəbul olunma; ~ **of the agenda** gündəliyi qəbul etmə *(iclasda və s.)*; **3.** *dilç.* alma, götürmə *(formasını dəyişmədən)*
**adoptive** [ə'dɔptɪv] *adj* **1.** övladlığa götürülmüş; ~ **child** övladlığa götürülmüş uşaq; **2.** ögey; ~ **mother** ögey ana, analıq; ~ **father** ögey ata, atalıq; ~ **son** ögey oğul, oğulluq; ~ **daughter** ögey qız, qızlıq; ~ **parents** ögey valideynlər
**adorable** [ə'dɔ:rəbl] *adj* **1.** məftunluğa layiq olan, çox sevilən; **2.** məlahətli, cazibəli, çox gözəl, füsunkar; ~ **curtains** çox gözəl pərdələr
**adoration** [,ædɔ:'reɪʃn] *n* məftunluq, pərəstiş etmə; pərəstiş, sitayiş, sitayiş etmə; **object of ~** pərəstiş obyekti, sitayiş obyekti
**adore** [ə'dɔ:] *v* **1.** pərəstiş etmək, məftun olmaq; **2.** həddən artıq sevmək; **to ~ music** musiqini çox sevmək, musiqiyə aludə olmaq; **to ~ children** uşaqları çox sevmək; **to ~ swimming** üzməyi çox sevmək
**adorer** [ə'dɔ:rəʳ] *n* pərəstişkar, pərəstiş edən; aşiq
**adorn** [ə'dɔ:n] *v* **1.** bəzəmək; **to ~ a room with flowers** otağı çiçəklərlə bəzəmək; **to ~ oneself (with)** bəzənmək, bəzənib-düzənmək, geyinib-kecinmək; **to ~ oneself with fine clothes** qəşəng paltar geyinib bəzənmək / geyinib-kecinmək
**adornment** [ə'dɔ:nmənt] *n* **1.** bəzək, bəzək-düzək; **beautiful ~s** gözəl bəzəklər; **2.** bəzənmə, bəzənib-düzənmə, geyinib-kecinmə
**adrenalin** [əd'renəlɪn] *n əcz.* adrenalin *(dərman adı)*
**adrift**[1] [ə'drɪft] *adj* üzən, axınla hərəkət edən *(gəmi, qayıq və s.)*; nəzarətsiz
**adrift**[2] [ə'drɪft] *adv* axınla; **to set / to cut ~ 1)** axın üzrə buraxmaq; **2)** taleyin ümidinə buraxmaq; **to go ~** dref etmək *(küləyin, yaxud su axınının təsiri ilə yolundan kənara çıxmaq: qayıq, gəmi və s.)*; **to turn ~ 1)** evdən qovmaq; **2)** taleyin ümidinə buraxmaq; **3)** işdən qovmaq; *He cut himself adrift from his people O, qohumlarından üz döndərdi, O, qohumları ilə əlaqəsini kəsdi*
**adroit** [ə'drɔɪt] *adj* zirək, diribaş, mahir, fəndgir, məharətli, bacarıqlı, qabil, usta, fərasətli; ~ **debater** mahir/diribaş/fərasətli /bacarıqlı / qabil mübahisəçi
**adroitly** [ə'drɔɪtlɪ] *adv* məharətlə, ustalıqla, bacarıqla, fərasətlə, cəld, zirək
**adroitness** [ə'drɔɪtnɪs] *n* cəldlik, zirəklik, çeviklik, diribaşlıq
**adulate** ['ædjuleɪt] *v* yaltaqlanmaq, yaltaqlıq etmək, quyruq bulamaq, qılığına girmək
**adulation** [,ædju'leɪʃn] *n* yaltaqlıq; alçalma, köləcəsinə səcdə etmə; **master of ~** yaltaqlıq mücəssəməsi
**adulator** ['ædjuleɪtəʳ] *n* yaltaq; ikiüzlü, riyakar
**adulatory** [,ædju'leɪtərɪ] *adj* yaltaq
**adult**[1] ['ædʌlt] *n* **1.** böyük, yaşlı; yaşa dolmuş adam; **courses for ~s** yaşlılar / böyüklər üçün kurs; *For adults only! Ancaq böyüklər üçün! (film və s.)*; **2.** *hüq.* 14 yaşından yuxarı gənc, 12 yaşından yuxarı qız



**adult**[2] ['ædʌlt] *adj* böyük, yekə, yaşlı; **an ~ film** böyüklər üçün film
**adulterate**[1] [ə'dʌltrɪt] *adj* pisləşdirilmiş, qatılmış *(ərzaq və s. haq.)*; ~ **milk** qatılmış süd *(su ilə)*
**adulterate**[2] [ə'dʌltəreɪt] *v* **1.** qarışdırmaq, qatmaq *(su və s.)*; **to ~ milk with water** südə su qatmaq; **2.** *arx.* zina etmək
**adulteration** [ə,dʌltə'reɪʃn] *n* qarışdırılma, qarışdırma; ~ **of food** ərzağı qarışdırma
**adulterer** [ə'dʌltərəʳ] *n* zinakar, zina edən kişi
**adulteress** [ə'dʌltərɪs] *n* zinakar qadın, zina edən qadın
**adulterize** [ə'dʌltəraɪz] *v* zina etmək *(arvadına və ya ərinə xəyanət etmək)*
**adulterous** [ə'dʌltərəs] *adj* zina edən, ər-arvadlıq sədaqətini pozan
**adultery** [ə'dʌltərɪ] *n* zina; ər və ya arvad sədaqətsizliyi; **to commit ~** zina etmək; ər-arvad sədaqətini pozmaq
**adumbrate** ['ædʌmbreɪt] *v* gələcəkdən xəbər vermək *(təxminən)*
**adumbration** [,ædʌm'breɪʃn] *n* **1.** əlamət; işarə; **2.** eskiz, layihə; **3.** gələcəkdən xəbər vermə
**adv** [əd'və:b] **adverb** *isminin qısa forması (yazıda)*
**advance**[1] [əd'va:ns] *n* **1.** irəliyə hərəkət; yayılma; irəliləmə, irəliləyiş; ~ **of an epidemic** epidemiyanın yayılması; **2.** *hərb.* hücum; ~ **in force** iri qüvvə ilə hücum; **in ~** əvvəlcədən, qabaqcadan, irəlicədən; **3.** tərəqqi; irəliləyiş; proqres; **industrial ~** sənayenin tərəqqisi/irəliləyişi; ~ **in rank** vəzifədə/rütbədə irəliləyiş; ~ **of science** elmdə tərəqqi / irəliləyiş; **4.** avans, ssuda; borc; beh; **to pay in ~** avans / beh vermək; *This bank makes advances Bu bank borc / ssuda verir*
**advance**[2] [əd'va:ns] *v* **1.** irəliləmək, qabağa getmək; **to ~ 20 miles** 20 mil irəliləmək; *They advanced 20 miles Onlar 20 mil irəlilədilər; A month had passed and the work has not advanced Bir ay keçib, amma iş irəliləməyib / qabağa getməyib;* **2.** hücum etmək, yerimək; **to ~ on the enemy** düşmən üzərinə yerimək; *The soldiers advanced on the enemy Əsgərlər düşmən üzərinə yeridilər;* **3.** irəli çəkmək; **to ~ the date of the meeting** iclasın tarixini irəli çəkmək; *He was advanced to the position of manager Onu menicer vəzifəsinə irəli çəkdilər;* **4.** əvvəldən pul vermək; **to ~ a month's salary** bir aylıq əmək haqqını əvvəldən vermək
**advanced** [əd'va:nst] *adj* **1.** qabaqcıl, mütərəqqi, müasir; ~ **ideas** mütərəqqi / qabaqcıl ideyalar; **2.** qoca, yaşlı; ~ **in years, in ~ years** qoca, çox qoca, pirani; **3.** elmi iş; ~ **studies** gücləndirilmiş təhsil
**advantage**[1] [əd'va:ntɪdʒ] *n* **1.** üstünlük; imtiyaz, müstəqil hüquq; **the ~s of a good education** yaxşı təhsilin üstünlükləri; **to gain/to get/to win/to have an ~ of/ over smb.** bir kəsə üstün gəlmək, bir kəs üzərində üstünlük qazanmaq; **2.** mənfəət, xeyir; fayda; **to take ~ of smth.** bir şeydən mənfəət/xeyir/fayda götürmək; bir şeydən sui-istifadə etmək; *He took advantage of my mistake O mənim səhvimdən sui-istifadə etdi; This is to my advantage Bu mənim üçün faydalıdır, Bu mənim üçün xeyirlidir;* **to take ~ of opportunity** imkandan istifadə etmək; **3.** *id. (hesabda)* üstünlük *(xüs. tennis-oyununda)*;
◊ **to take ~ of smb. 1)** bir kəsə kələk gəlmək; bir kəsi aldatmaq; **2)** bir kəsi istismar etmək; **to play the ~s over smb.** *amer.* bir kəsi aldatmaq, bir kəsə kələk gəlmək; **to take smb. at ~** qəfildən bir kəsin üstünü almaq; qəfildən bir kəsə hücum etmək
**advantage**[2] [əd'va:ntɪdʒ] *v* üstünlük vermək; şərait yaratmaq; təkan vermək; **to ~ agriculture** kənd təsərrüfatına üstünlük vermək, kənd təsərrüfatının inkişafına şərait yaratmaq
**advantageous** [,ædvən'teɪdʒəs] *adj* xeyirli, faydalı, sərfəli, qazanclı; əlverişli; ~ **position** əlverişli vəziyyət; ~ **business** xeyirli/faydalı /sərfəli iş; ~ **offer** faydalı / sərfəli / əlverişli təklif
**advent** ['ædvənt] *n* gəlmə, peyda olma; meydana çıxma/gəlmə; *Society has changed rapidly since the advent of the car Maşının meydana gəlməsindən sonra cəmiyyət sürətlə dəyişib*
**Advent** ['ædvent] *n* **1.** İsanın zühur etməsi; **2.** Milad bayramından əvvəlki dörd həftə; **3. The Second Advent** İsa peyğəmbərin ikinci dəfə dünyaya gəlməsi *(gələcəkdə)*
**Adventist** ['ædventɪst] *n* İsa peyğəmbərin ikinci dəfə zühur etməsinin yaxın olmasına inanan adam
**adventitious** [,ædven'tɪʃəs] *adj* **1.** gözlənilmədən, təsadüfi; **the ~ birth of a child** uşağın gözlənilmədən doğulması; **2.** *bot.* əlavə; ~ **bud** əlavə törəyən/əmələ gələn tumurcuq; ~ **roots** əlavə yaranan köklər, yana gedən köklər *(bitkilərdə)*
**adventure**[1] [əd'ventʃəʳ] *n* **1.** macəra; **the ~s of Tom Sawyer** Tom Soyerin macəraları; **her ~s** onun macəraları; *I told them of my adventures in the mountain Mən onlara dağda başıma gələn macəralardan danışdım;* **2.** risk, təhlükə; **to put one's life in ~** həyatını təhlükəyə məruz qoymaq, həyatı ilə risk etmək
**adventure**[2] [əd'ventʃəʳ] *v* risk etmək, təhlükədən qorxmadan hərəkət etmək, təhlükəyə salmaq, təhlükəyə məruz qoymaq; **to ~ one's life** həyatını təhlükəyə məruz qoymaq, riskə getmək
**adventurer** [əd'ventʃərəʳ] *n* **1.** avantürist, fırıldaqçı; **2.** *arx.* macəra axtaran, macəra sevən
**adventuress** [əd'ventʃərɪs] *n* **1.** avantürist qadın, macəra axtaran qadın; fırıldaqçı qadın; **2.** *arx.* macəra axtaran qadın, macəra sevən qadın
**adventurous** [əd'ventʃərəs] *adj* **1.** macəraçı, macəra sevən; **2.** təhlükəli, qorxulu, xatalı; **an ~ voyage** macəralı / təhlükəli dəniz səyahəti

A-3403
M.F.Axundov adına Azərbaycan Milli

**adventurously** [əd'ventʃərəslı] *adv* 1. təhlükəli, xatalı; 2. cəsarətlə, qorxmadan
**adverb** ['ædvə:b] *n qram.* zərf
**adverbial**¹ [əd'və:bjəl] *n qram.* zərflik
**adverbial**² [əd'və:bjəl] *adj qram.* zərflik; ~ **clauses** zərflik budaq cümlələri
**adverbially** [əd'və:bjəlı] *adv qram.* zərflik kimi, zərflik rolunda
**adversary** ['ædvəsərı] *n* rəqib; düşmən; ◊ **the (old) Adversary** *evf.* Şeytan, iblis
**adversative** [əd'və:sətıv] *adj* 1. əks məna bildirən *(söz və ya termin)*; 2. *qram.* ziddiyyət bildirən *(bağlayıcı haq.)*; ~ **conjunctions** ziddiyyət bildirən bağlayıcılar; ***But** is an adversative conjunction* ***But*** *ziddiyyət bildirən bağlayıcıdır*
**adverse** ['ædvə:s] *adj* 1. əks, əleyhinə; **an ~ decision** zidd / əleyhinə qərar; 2. əlverişsiz, namünasib; əks, əks istiqamətdə əsən; **~ winds** əks / əks istiqamətdə əsən küləklər; **under ~ circumstances** əlverişsiz şəraitdə
**adversely** ['ædvə:slı] *adv* əks, əleyhinə, ziddinə, əksinə
**adversion** [əd'və:ʃn] *n arx.* diqqət, etina, fikir
**adversity** [əd'və:sıtı] *n* bədbəxtlik, bəla, müsibət, bəxtin dönüklüyü, fəlakət; yaman gün; **to show courage under ~** çətin anlarda cəsarət göstərmək/cəsarətli olmaq; **to be schooled in ~** müsibətə sinə gərmək, fəlakətdən qorxmamaq; **to meet adversities** bədbəxtliyə düçar olmaq, fəlakətlə qarşılaşmaq; **in the face of ~** fəlakət qarşısında; fəlakətlə üzbəüz; *A good friend will not desert one in time of adversity Yaxşı dost adamı müsibətdə / yaman gündə qoyub qaçmaz*
**advert** [əd'və:t] *n* **advertisement** *isminin qısa forması*
**advertise** ['ædvətaız] *v* 1. elan vermək; **to ~ for smth.** bir şey üçün elan vermək; 2. reklam etmək, reklam vasitəsilə bildirmək; **to ~ goods** malları / əmtəələri reklam etmək; 3. *arx.* bildirmək, xəbər vermək, çatdırmaq; *He advertised me of his designs O öz niyyətləri barədə mənə xəbər verdi, O öz niyyətlərini mənə çatdırdı / bildirdi*
**advertisement** [əd'və:tısmənt] *n* 1. elan; reklam; anons; **office for ~s** reklamlar bürosu, elanlar bürosu; **to insert / to put an ~** *(in the newspaper)* elan vermək *(qəzetdə)*; 2. *arx.* bildiriş; xəbər vermə
**advertizing**¹ ['ædvətaızıŋ] *n* reklam işi, reklam / elan vasitəsilə bildirmə, reklam etmə
**advertizing**² ['ædvətaızıŋ] *adj*: ~ **media** reklam vasitələri; *Newspaper and television are advertizing media Qəzet və televiziya reklam vasitələridir*
**advice** [əd'vaıs] *n* 1. məsləhət; **a piece / a bit / a word of ~** bir məsləhət; **to ask *smb.'s* ~** bir kəslə məsləhətləşmək, bir kəsdən məsləhət almaq; **to take *smb.'s* ~** bir kəsin məsləhətini qəbul etmək; bir kəsin məsləhətinə baxmaq; **to follow *smb.'s* ~** bir kəsin məsləhətinə qulaq asmaq; *Let me give you a piece / a bit of advice Qoy / Qoyun sənə / sizə bir məsləhət verim;* 2. *pl* xəbər; **disagreeble ~s** xoşa gəlməyən xəbər/məlumat; informasiya; 3. *arx.* fikir, rəy, mühakimə; 4. məsləhət *(həkimin, hüquqşünasın)*; **legal ~** hüquqşünas məsləhəti
**advisability** [əd,vaızə'bılıtı] *n* məqsədəmüvafiqlik, məqsədəuyğunluq; **the ~ of holding a conference** konfrans keçirməyin məqsədəmüvafiqliyi / məqsədəuyğunluğu
**advisable** [əd'vaızəbl] *adj* məqsədəuyğun, əlverişli; məntiqə uyğun, ağlabatan; məsləhət görülən; *It is advisable for you to stay at home Məsləhətdir ki, sən / siz evdə qalasan /qalasınız*
**advisableness** [əd'vaızəblnıs] *n* = **advisability**
**advise** [əd'vaız] *v* 1. məsləhət vermək; **to ~ *smb.* to do *smth.*** bir işi görməyi bir kəsə məsləhət görmək; *I advise you to stop smoking Mən sizə məsləhət görürəm ki, papirosu / papiros çəkməyi atasınız;* 2. məsləhətləşmək, məsləhət almaq; 3. xəbər vermək, xəbərdar etmək, məlumat vermək; **to ~ the authority about *smth.*** müdiriyyətə bir şey haqqında məlumat vermək, bir şey haqqında müdiriyyətə xəbər çatdırmaq; *Please advise us when the delegation arrives Zəhmət olmasa, nümayəndə heyətinin nə vaxt gələcəyini bizə xəbər ver/verin*
**advisedly** [əd'vaızıdlı] *adv* 1. ətraflı düşünərək, ətraflı götür-qoy etməklə; 2. qəsdən, bilərəkdən, qərəzlə
**adviser** [əd'vaızə^r] *n* müşavir, məsləhətçi, məsləhət verən *(adam)*, konsultant; **technical ~** texniki işlər üzrə məsləhətçi / konsultant
**advisory** [əd'vaızərı] *adj* məşvərətçi, məsləhətçi; **~ opinion** məşvərətçi rəy
**advocacy** ['ædvəkəsı] *n* 1. müdafiə; vəkil fəaliyyəti; advokatlıq, vəkillik; 2. təbliğat *(fikir, baxış və s. haq.)*
**advocate**¹ ['ædvəkıt] *n* 1. vəkil; vəkillik etmə; 2. müdafiəçi, tərəfdar; qoruyucu, müdafiə edən; **~ of peace** sülh müdafiəçisi, sülh tərəfdarı
**advocate**² ['ædvəkeıt] *v* müdafiə etmək; təbliğ etmək; tərəfdar olmaq; **to ~ peace** sülhü müdafiə etmək, sülhü təbliğ etmək; *I don't advocate building large factories Mən iri fabriklər / zavodlar tikməyin tərəfdarı deyiləm*
**adynamic** [,ædaı'næmık] *adj tib.* zəif, gücsüz, taqətsiz, tabsız, halsız
**adz** [ædz] *n* = **adze**¹
**adze**¹ [ædz] *n* kərki *(ağac yonmaq/alaq vurmaq üçün alət)*
**adze**² [ædz] *v* yonmaq, yonub hamarlamaq; yontalamaq *(kərki ilə)*
**aegis** ['ı:dʒıs] *n* himayə, sayə; **under the ~** himayəsi altında; **~ of the UNO** BMT-nin himayəsi altında
**aeon** ['ı:ən] *n* əbədiyyət, əbədilik, daimilik



**aerate** ['eəreıt] *v* 1. havasını dəyişmək, havaya vermək; 2. qaz/hava vurmaq *(xüs. içkiyə)*; 3. aerasiya etmək; havalandırmaq
**aeration** [eıə'reıʃn] *n* 1. havasını dəyişdirmə, ventilyasiya etmə; 2. aerasiya; **~ of the soil** torpağı aerasiya etmə, torpağın aerasiyası
**aerial** ['eərıəl] *adj* hava; **~ camera** hava kamerası; **~ navigation** aeronaviqasiya
**aerobatics** [eərou'bætıks] *n av.* yüksək pilotaj *(təyyarəçilik məharəti)*
**aerobomb** ['eəroubɔm] *n* təyyarə bombası
**aerodrome** ['eərədroum] *n* aerodrom, təyyarə meydanı
**aerodynamics** [,eərou'daınæmıks] *n* aerodinamika *(cisimlərin hərəkəti zamanı havanın onlara müqavimətindən bəhs edən elm)*
**aero-engine** [,eərou'endʒın] *n* təyyarə mühərriki
**aerography** [eə'rɔgrəfı] *n* aerologiya *(atmosferin yuxarı qatlarında olan prosesləri öyrənən elm)*
**aeroplane** ['eərouplein] *n* hidroplan, təyyarə
**aerosol** ['eərəsoul] *n kim.* aerozol
**aerospace** ['eərəspeıs] *n* atmosfer
**afar** [ə'fa:^r] *adv* uzaqdan, uzaq məsafədən; **to see from ~** uzaqdan görmək
**affability** [,æfə'bılıtı] *n* mehribanlıq, mehribançılıq, üzügülərlik, xoşüzlülük; nəzakət; lütfkarlıq
**affable** ['æfəbl] *adj* mehriban, iltifatlı, gülərüzlü, lütfkar, xoşsifət
**affably** ['æfəblı] *adv* mehribanlıqla, lütfkarlıqla, lütfkarcasına, mehribancasına
**affair** [ə'feə^r] *n* 1. iş; **important ~s** vacib işlər; *It's not your affair Bu sənin / sizin işin / işiniz deyil; Mind your own affairs d.d. Öz işinlə / işinizlə məşğul ol/olun!* **an ~ of honour** şərəf işi; 2. *pl* işlər; məşğuliyyət; **man of ~s** işgüzar adam; **foreign ~s** xarici işlər; **internal/domestic ~s** daxili işlər; **~s of state** dövlət işləri; **Ministry of Home Affairs** Daxili İşlər Nazirliyi; **Ministry of Foreign Affairs** Xarici İşlər Nazirliyi; 3. macəra; **love ~s** məhəbbət macərası; 4. eşqbazlıq, roman; *He's having an affair with Jane O, Ceynlə eşqbazlıq edir;* 5. *hərb.* toqquşma
**affect** [ə'fekt] I *v* 1. təsir etmək, təsir göstərmək, təsirə məruz qoymaq; *The cold climate affected her health Soyuq hava onun səhhətinə təsir etdi;* **to ~ public opinion** ictimai rəyə təsir etmək; *It affects me personally O şəxsən mənə təsir edir, Onun şəxsən mənə dəxli var;* 2. həyəcana gətirmək, təsir etmək, narahat etmək; *The news affected her greatly Xəbər onu çox narahat etdi, Xəbər ona çox təsir etdi;* 3. ziyan vermək, ziyan vurmaq, zərər yetirmək; **to ~ *smb.'s* interest** bir kəsin marağına ziyan vurmaq; 4. *tib.* təsir etmək, ziyan vurmaq; **to ~ *smb.'s* heart/eyes/lungs** bir kəsin ürəyinə /gözünə/ciyərlərinə təsir etmək; *Smoking affects health Papiros çəkmək sağlamlığa ziyan vurur / ziyan edir*
**affect** [ə'fekt] II *v* 1. hiylə etmək, riyakarlıq etmək; yalandan özünü ... göstərmək/oxşatmaq.../qoymaq; **to ~ ignorance** özünü nadanlığa qoymaq; özünü nadan kimi göstərmək/bilməməzliyə vurmaq; *He affected not to hear me O özünü elə göstərdi ki, guya məni eşitmir, O özünü eşitməməzliyə vurdu;* 2. sevmək, xoşlamaq; tez-tez istifadə etmək; geyinmək; **to ~ black suit** qara kostyum geyməyi sevmək; **to ~ long sentences** uzun cümlələr işlətməyi xoşlamaq; *Rice affects moist land Düyü nəm torpağı sevir*
**affectation** [,æfek'teıʃn] *n* sünilik, riyakarlıq, yalançılıq, ikiüzlülük, süni həyəcan; **silly ~** gic riyakarlıq; *She is full of affectation O, başdan ayağa riyakardır;* **to fall into ~** özünü naza qoymaq, əzilib-büzülmək
**affected** [ə'fektıd] *adj* 1. ikiüzlü, süni, riyakar, qeyri-təbii, saxta; **~ smile** süni /riyakar /saxta təbəssüm; **~ manners** ədəbaz / ədalı davranış; *He is an affected person O, ədəbaz adamdır;* 2. mütəəssirlənmiş; **deeply ~ by the sad news** kədərli xəbərdən bərk mütəəssirlənmiş; 3. mübtəla olan, əziyyət çəkən, əzab çəkən; **~ with gout** podaqradan əziyyət çəkən; **~ with rheumatism** revmatizmdən əzab çəkən
**affectedly** [ə'fektıdlı] *adv* 1. nazla, qəmzə ilə; ədəbaz; 2. riyakarcasına, süni, hiyləgərcəsinə, yalandan, riyakarlıqla
**affectedness** [ə'fektıdnıs] *n* 1. yalançılıq, hiyləgərlik, riyakarlıq, sünilik; 2. naz, qəmzə, işvə; nazlılıq
**affecting** [ə'fektıŋ] *adj* təsirli, riqqətli, həyəcanlandırıcı, riqqətə gətirən, riqqət doğuran; **~ parting** təsirli/riqqətləndirici/ həyəcanlandırıcı ayrılıq, **~ scene** həyəcanlandırıcı/riqqət doğuran/təsirli mənzərə
**affection** [ə'fekʃn] *n* 1. məhəbbət, bağlılıq; rəğbət, hüsn-rəğbət; **sincere ~** səmimi məhəbbət / rəğbət; **true ~** həqiqi bağlılıq /rəğbət/məhəbbət; **tender ~** zərif məhəbbət/rəğbət; **to have an ~ towards *smb.*** bir kəsə rəğbət göstərmək; **to feel an ~ towards *smb.*** bir kəsə meyli / məhəbbəti olmaq; **to set / to fix *one's* ~s upon *smb.*** bir kəsi sevmək, bir kəsə rəğbət bəsləmək, bir kəsə qarşı rəğbəti olmaq, bir kəsə bağlanmaq *(məhəbbətlə və s.)*; 2. xəstəlik, mərəz; **~ of the throat/the heart /the lung** boğaz/ürək/ciyər xəstəliyi
**affectional** [ə'fekʃənl] *adj* zərif, incə; hissiyatlı, tez mütəəssir olan, tez həyəcanlanan
**affectionate** [ə'fekʃnıt] *adj* 1. sevən, istəyən, məhəbbətli, məhəbbətlə dolu; **~ mother** sevən ana; **~ wife** sevən arvad; **~ look** məhəbbətlə dolu gözlər, sevdalı gözlər; 2. *arx.* ehtiraslı, ehtirasla dolu, hərarətli, qızğın, həvəsli
**affectionately** [ə'fekʃnıtlı] *adv* hörmətlə, məhəbbətlə, sevgi ilə; **Yours ~** Sizə hörmət bəsləyən..., Hörmətlə sizin... *(məktubun sonunda yazılır)*

**affiance**[1] [ə'faɪəns] *n* 1. nişanlanan zamanı verilən vəd; 2. adaxlanma; adaxlama; nişan; şirni
**affiance**[2] [ə'faɪəns] *v d.d.* nişanlamaq, nişanlanarkən vəd vermək; **to be ~d to** ***smb.*** bir kəsə nişanlanmaq
**affianced** [ə'faɪənst] *adj* nişanlı, adaxlı, nişanlanmış, ad edilmiş
**affidavit** [,æfɪ'deɪvɪt] *n hüq.* andla təsdiq edilmiş yazılı şahidlik; **to swear/to make an ~** and içərək yazılı şahidlik etmək / şahidlik vermək
**affiliate** [ə'fɪlɪeɪt] *v* 1. birləşdirmək *(xüs. cəmiyyəti, təşkilatı)*; birləşmək; **to ~ to** ***smth.*** bir şeyə birləşmək; 2. üzvlüyə götürmək; 3. *hüq.* müəllifliyi müəyyənləşdirmək; 4. *hüq.* əlaqəni müəyyənləşdirmək, başlanğıcını tapmaq
**affiliation** [ə,fɪlɪ'eɪʃn] *n* 1. birləşdirmə; üzvlüyə qəbul etmə; üzvluk; 2. *hüq.* atalığı müəyyənləşdirmə; müəllifliyi müəyyənləşdirmə *(məhkəmə yolu ilə)*; 3. *hüq.* oğulluğa götürmə; 4. mənbəyi tapma / müəyyənləşdirmə
**affinity** [ə'fɪnɪtɪ] *n* 1. yaxınlıq; oxşarlıq; **close ~ between** ***smb.*** kimlərinsə arasında yaxın oxşarlıq; **spiritual ~** mənəvi yaxınlıq; *There is much affinity between them Onlar arasında çox oxşarlıq var;* 2. qohumluq *(ər və ya arvad tərəfindən)*; 3. *top.i* qohumlar *(ər və ya arvad tərəfdən)*; 4. oxşarlıq, quruluş oxşarlığı; **~ of languages** dillərin oxşarlığı *(quruluşca)*; 5. rəğbət, meyl, cazibə, simpatiya; *There is a strong affinity between them Onlar arasında güclü rəğbət var, Onlar bir-birinə güclü rəğbət bəsləyirlər*
**affirm** [ə'fə:m] *v* 1. təsdiq etmək, doğru olduğunu təsdiq etmək *(həm də məhkəmənin qərarını və s.)*; **to ~ a decision** qərarı təsdiq etmək; **to ~ the truth of the statement** bəyanatın doğruluğunu təsdiq etmək; 2. təntənəli şəkildə elan etmək; *He affirmed his love for me O mənə olan məhəbbətini təntənə ilə elan etdi*
**affirmation** [,æfə'meɪʃn] *n* 1. bəyanat; inandırma; təsdiq, təsdiq etmə, təsdiqləmə; 2. *hüq.* təntənəli şəkildə bəyan etmə
**affirmative** [ə'fə:mətɪv] *adj* 1. müsbət, təsdiq; **an ~ answer** təsdiq cavab; **an ~ sentence** təsdiq cümlə; **to answer in the ~** təsdiq/ müsbət cavab vermək; 2. *riyaz.* müsbət
**affix**[1] ['æfɪks] *n qram.* affiks, şəkilçi
**affix**[2] [ə'fɪks] *v* 1. **(to, on, upon)** yapışdırmaq; vurmaq; **to ~ a stamp to the envelope** zərfə marka yapışdırmaq; **to ~ a seal to a document** sənədə möhür vurmaq; *I affixed a stamp to the envelope Mən zərfə marka yapışdırdım;* 2. əlavə etmək; **to ~ a letter to a word** sözə hərf əlavə etmək; 3. çəkmək *(qol)*; **to ~ one's signature** qol çəkmək, imza atmaq
**affixation** [,æfɪk'seɪʃn] *n dilç.* şəkilçiləşmə
**afflict** [ə'flɪkt] *v* əziyyət vermək; məyus / məhv etmək; ziyan vurmaq
**affliction** [ə'flɪkʃn] *n* 1. bədbəxtlik, fəlakət; to **bear up against ~** fəlakətə dözmək / sinə gərmək; 2. qüssə, kədər; **to be comforted in** ***one's*** **~** kədərli vaxtda təsəlli / təskinlik tapmaq; 3. xəstəlik, nasazlıq, naxoşluq
**affluence** ['æfluəns] *n* 1. zənginlik, bolluq; var-dövlət; **to live in ~** bolluq / zənginlik içərisində yaşamaq; 2. axın, axıb gəlmə; **an ~ of foreigners** xaricilərin / əcnəbilərin axını; 3. *coğr.* qol *(çayda)*
**affluent** ['æfluənt] *adj* 1. bol, varlı, zəngin; **the ~ society** varlı / zəngin cəmiyyət; **~ in idioms** idiomlarla zəngin; 2. sərbəst axan / tökülən
**afford** [ə'fɔ:d] *v* 1. imkanı olmaq, imkan əldə etmək *(bir qayda olaraq* **can, could, to be able to** *felləri ilə işlənir)* **can afford, to be able to afford**; *At last we can afford to buy a car Nəhayət bizim maşın almağa imkanımız var;* 2. vermək, təqdim etmək; **to ~ an instance** imkan vermək; **to ~ shelter** daldalanacaq vermək; *Trees afford shade Ağaclar kölgə salır*
**afforest** [ə'fɔrɪst] *v* meşə salmaq
**afforestation** [æ,fɔrɪs'teɪʃn] *n* meşəsalma, ağacəkmə
**affray**[1] [ə'freɪ] *n* 1. dava, dava-dalaş; 2. *hüq.* ictimai yerdə iki və daha çox adam arasında dava-dalaş
**affray**[2] [ə'freɪ] *v* qorxutmaq, hürkütmək, hürküdüb qaçırmaq
**affricate** ['æfrɪkɪt] *n fon.* afrikat *(novlu samit)*
**affront**[1] [ə'frʌnt] *n* təhqir *(camaat qarşısında)*; həqarət; *It was an affront to his pride Bu onun mənliyinə qarşı təhqir idi*
**affront**[2] [ə'frʌnt] *v* 1. təhqir etmək; alçaltmaq; **to be greatly ~ed** bərk təhqir olunmaq; 2. cəsarətlə qarşılamaq, sinə gərmək; **to ~ death** ölümü cəsarətlə qarşılamaq, ölümə sinə gərmək
**affronted** [ə'frʌntɪd] *adj* 1. bərk təhqir olunmuş / edilmiş; incidilmiş, küsdürülmüş, narazı, küsmüş; 2. *arx.* utanmaz, həyasız, sırtıq
**Afghan**[1] ['æfgæn] *n* 1. əfqan, Əfqanıstan vətəndaşı; **the ~s** *top.i* əfqanlar; 2. əfqan dili; 3. *amer.* toxunma yun şal; 4. hündür nazik cəld ov iti
**Afghan**[2] ['æfgæn] *adj* əfqan
**Afghan hound** ['æfgæn 'haund] *n* hündür, nazik, cəld ov iti
**Afghani** [æf'gænɪ] *n* əfqani *(Əfqanıstanda işlənən pul vahidi)*
**afield** [ə'fi:ld] *adv* 1. uzağa, uzaq; **to go too far ~** çox uzağa getmək; *Don't go too far afield or we shall lose you Çox uzağa getmə/getməyin, yoxsa səni / sizi itirərik;* 2. tarlada, plantasiyada *(kənd təsərrüfatı işçiləri haq.)*
**afire**[1] [ə'faɪəʳ] *adv* od içində; **to set ~** yandırmaq, odlamaq, oda qalamaq, od vurmaq
**afire**[2] [ə'faɪəʳ] *adj* oda qalanmış, oda tutulmuş, od içində olan
**aflame**[1] [ə'fleɪm] *adj* alova bürünmüş, alova qərq olmuş; **~ with blushes** utandığından pörtmüş /qızarmış vəziyyətdə olma
**aflame**[2] [ə'fleɪm] *adv* 1. od içində, alov içində; *The house was aflame Ev od içində idi, Ev od tutub yanırdı, Evi alov bürümüşdü;* 2. *məc.* **to be ~** boyanmaq; bürünmək, qərq olmaq; *The gardens were aflame with red and orange leaves Bağlar qırmızı və narıncı yarpağa bürünmüşdü / qərq olmuşdu*
**afloat**[1] [ə'flout] *adj* 1. suyun səthində / üzərində üzən; **a boat ~** üzən qayıq; 2.: *məc.* **to be ~** gəzmək, dolaşmaq; *Rumours are afloat Şayiələr gəzir / dolaşır;* 3. gəmidə, açıq dənizdə; *How long did you spend afloat? Sən / Siz açıq dənizdə nə qədər oldun?/ oldunuz?;* 4. su ilə dolmuş; **decks ~** su ilə dolmuş göyərtə
**afloat**[2] [ə'flout] *adv* suda, suyun üzündə, suyun səthində; **to keep ~ 1)** su üzərində /səthində durmaq/üzmək; batmamaq *(suya)*; **2)** *məc.* borc içində batmamaq; **life ~** dənizdə keçən həyat, dənizçi həyatı
**afoot** [ə'fut] *adv* 1. ayağı üstə, hərəkətdə; **to be early ~** erkən qalxmaq/durmaq *(yuxudan)*, ayağı üstə olmaq; **to set** ***smth.*** **~** bir şeyi işə salmaq, bir şeyi hərəkətə gətirmək; 2. *arx.* piyada, ayaq ilə
**aforementioned** [ə'fɔ:menʃənd] *adj* yuxarıda xatırladılmış/qeyd edilmiş/adı çəkilmiş
**aforenamed** [ə'fɔ:neɪmd] *adj* yuxarıda adı çəkilmiş
**aforesaid** [ə'fɔ:sed] *adj* yuxarıda deyilmiş, yuxarıda qeyd edilmiş
**aforethought** [ə'fɔ:θɔ:t] *adj* əvvəldən/qabaqcadan düşünülmüş, əvvəlcədən fikirləşilmiş
**aforetime** [ə'fɔ:taɪm] *adv arx.* əvvəllər, qabaqlar, keçmişdə
**afraid** [ə'freɪd] *adj* 1. qorxmuş, hürkmüş; qorxudulmuş, hürküdülmüş; **to be ~ (of) 1)** qorxmaq; **to be ~ of** ***smb./smth.*** bir kəsdən/şeydən qorxmaq; **to be ~ of a dog** itdən qorxmaq; **to be ~ of hard work** ağır işdən qorxmaq; *Don't be afraid of asking for help Kömək istəməkdən qorxma/qorxmayın;* **2)** *Baş vermiş və ya verəcək bir şey üçün təəssüf bildirmək maqamında işlədilir; I'm afraid I've lost your pen Qorxuram sənin /sizin qələmini /qələminizi itirmiş olum; I'm afraid (that) we are late Qorxuram (ki), biz gecikək*
**afresh** [ə'freʃ] *adv* yenidən, təzədən; **to start ~** yenidən / təzədən başlamaq; *I've spoiled the painting and must do it afresh Mən şəkli korlamışam, onu yenidən işləməliyəm*
**African**[1] ['æfrɪkən] *n* afrikalı; **the ~s** *top. i* afrikalılar
**African**[2] ['æfrɪkən] *adj* Afrika; **~ languages** Afrika dilləri
**Afrikans** [,æfrɪ'ka:ns] *n* Cənubi Afrika dili *(Holland dilinə yaxın bir dil)*
**Afrikander** [,æfrɪ'kændəʳ] *n Cənubi Afrikada doğulmuş ağ irqə mənsub vətəndaş/adam,* holland
**Afro-** ['æfrou-] *n (həm də* **Afr.**) *mürəkkəb sözlərin tərkib hissəsi*: **Afro-Asian** Afro-Asiya



**after**[1] ['a:ftəʳ] *adj* 1. sonrakı; **an ~ period of life** həyatın sonrakı dövrü/müddəti; 2. *(adətən dənizçilikdə işlənir)* dal, arxa; **the ~ part of the ship** gəminin dal tərəfi
**after**[2] ['a:ftəʳ] *adv* sonra; ondan sonra; bir daha; *You speak first, I shall speak after Əvvəlcə sən danış, sonra mən danışacam; I never saw him after Mən onu bir daha görmədim*
**after**[3] ['a:ftəʳ] *prep* 1. *Zaman bildirir:* sonra; **~ performance** tamaşadan sonra; *After winter comes spring Qışdan sonra yaz gəlir;* **~ two years** iki ildən sonra; **~ a year** bir ildən sonra; **~ a while** bir azdan sonra; 2. *Məkan / Yer bildirir,* arxasında, dalında; *The school is just after the club Məktəb düz klubun arxasındadır;* 3. arxasınca, dalınca; **to run ~** ***smb.*** bir kəsin dalınca / arxasınca qaçmaq; *The dogs ran after the fox İtlər tülkünün dalınca qaçdılar; They threw stones after him Onlar onun arxasınca daş atdılar; Shut the door after you Qapını arxanca / arxanızca bağla / bağlayın (bir yerdən çıxdıqdan sonra); He looked after me O mənim arxamca baxdı;* **one ~ another** bir-birinin dalınca; 4. **-bə** *və ya* **bi** *şəkilçisi ilə tərcümə edilir:* **day ~ day** günbəgün; **time ~ time** vaxtbivaxt, dəfələrlə; *He read the book page after page O, kitabı səhifəbəsəhifə oxudu;* 5. uyğun/müvafiq olaraq; *He behaved after his nature O öz xasiyyətinə uyğun olaraq hərəkət etdi; She was dressed after the latest fashion O, (qız, qadın) son dəbə uyğun olaraq geyinmişdi;* 6. -a, -ə; *She takes after her mother O, anasına oxşayır;* **~ all** nəhayətdə, axırda; *I was right after all Axırda / Nəhayətdə mən haqlı çıxdım*
**after**[4] ['a:ftəʳ] *conj* sonra; *I left home after the rain had stopped Mən yağış kəsdikdən sonra evdən çıxdım; We went to the cinema after she came O gəldikdən sonra biz kinoya getdik*
**afterbirth** ['a:ftəbə:θ] *n* 1. *anat.* son, cift; 2. yaşlı valideynlərdən doğulan uşaq
**after-care** ['a:ftəkeəʳ] *n* qulluq, qulluq etmə *(1) xəstəlikdən sağalmış adama; 2) doğuşdan sonra qadına)*
**afterclap** ['a:ftəklæp] *n* gözlənilməz zərbə *(davadan sonra endirilən)*
**afterdays** ['a:ftədeɪz] *n pl.* sonrakı günlər
**after-effect** ['a:ftərɪ,fekt] *n* sonrakı nəticə, sonrakı təsir
**afterglow** ['a:ftəglou] *n* 1. şəfəq *(gün batandan sonra səmada qalan parıltı)*; 2. *məc.* xoş xatirə
**after-life** ['a:ftəlaɪf] *n* 1. ömrün son hissəsi; 2. axirət, axirət ömrü, axirət dünyasındakı həyat, axirət dünyası
**aftermath** ['a:ftəmæθ] *n* 1. nəticə; **~ of war** müharibənin nəticəsi; 2. xora *(çalınmış otun yerində bitən ot)*
**afternoon**[1] [,a:ftə'nu:n] *n* günortadan sonra; in **the ~** gündüz, günortadan sonra; *I'll sleep in the*

*afternoon Mən gündüz yatacam; Good afternoon! Günaydın! Günortan / Günortanız xeyir!*
**afternoon²** [ˌaːftəˈnuːn] *adj* **1.** gündüz, günortadan sonra; **an ~ sleep** gündüz yuxusu; **2.** ömrün son hissəsi; **in the ~ of *smb.'s*** life qoca çağlarında, sinli vaxtlarında; *He spent the afternoon of his life in his native country O, ömrünün ahıl çağlarını doğma kəndində keçirdi*
**after-pain** [ˈaːftəpeɪn] *n* **1.** *pl tib.* doğuşdan sonrakı ağrı; **2.** sonrakı ağrı
**afters** [ˈaːftəz] *n pl* **1.** ikinci yeyilən xörək; **2.** dessert
**aftershine** [ˈaːftəʃaɪn] *n* = **afterglow** *(1-ci mənada)*
**aftershave** [ˈaːftəʃeɪv] *n* üzü qırxdıqdan sonra işlədilən xoş ətirli maye
**after-taste** [ˈaːftəteɪst] *n* **1.** damaqda qalan dad; **2.** *məc.* ağır təsir / təəssürat
**afterthought** [ˈaːftəθɔːt] *n* **1.** gecikmiş fikir, başa çox gec gələn fikir; **2.** gecikmiş izahat/cavab; **3.** hiylə, kələk, fənd, biclik
**after-touch** [ˈaːftətʌtʃ] *n fot.* retuş *(fotoqrafiya neqativləri və ya şəkillərin tuşla düzəldilməsi)*
**after-treatment** [ˈaːftəˌtriːtmənt] *n tib.* müalicəni başa çatdırma *(əsas müalicədən sonra)*
**afterward** [ˈaːftəwəd] *adv amer.* = **afterwards**
**afterwards** [ˈaːftəwədz] *adv* sonra, sonradan; nəticədə
**after-winter** [ˈaːftəˌwɪntəʳ] *n* qışın qayıtması *(yəni yenidən soyuqların düşməsi)*
**after-world** [ˈaːftəwəːld] *n* **1.** *din.* axirət, axirət dünyası, o dünya; **2.** gələcək, gələcək nəsillər
**afteryears** [ˈaːftəjəːz] *n pl.* gələcək illər
**again** [əˈgeɪn, əˈgen] *adv* təkrarən, təkrar, bir də, bir daha, yenidən; **~ and ~** yenidən və yenidən, dəfələrlə, təkrarən; **never ~** bir daha, bir də; *Don't do that again Onu bir daha etmə / etməyin; Please say that again Zəhmət olmasa onu bir də de / deyin;*
◊ **now and ~, ever and ~** bəzən, hərdənbir, arabir, ara-sıra; **over ~** bir də; **time and ~** dəfələrlə, tez-tez
**against¹** [əˈgeɪnst] *prep* **1.** əleyhinə, ziddinə; **to vote ~** əleyhinə səs vermək; **2.** -a, -ə, qarşı; **to fight ~ *smb./smth.*** bir kəsə / şeyə qarşı mübarizə aparmaq; *Put the ladder against the wall Nərdivanı divara söykə/söykəyin*
**against²** [əˈgeɪnst] *conj* -a, -ə qədər; -a, -ə kimi; **~ the winter comes** qış girənə qədər / kimi
**agate** [ˈægət] *n min.* əqiq *(qiymətli daş)*
**age¹** [eɪdʒ] *n* **1.** yaş; *What is your age? Sənin /Sizin neçə yaşın/yaşınız var? Sənin /Sizin yaşın/yaşınız neçədir?*; **a man of middle ~** orta yaşlı adam/kişi; **school ~** məktəb yaşı; **at the ~ of twelve** on iki yaşda; **of my ~** mənim yaşıdım; **to act *one's* ~** öz yaşına müvafiq hərəkət etmək; **to look *one's* ~** öz yaşına müvafiq görünmək; **2.** əsr; dövr; **the Stone Age** Daş Dövrü; **the Ice Age**. Buzlaq Dövrü; **the Middle Ages** Orta Əsrlər; **the ~ of atom** atom dövrü / əsri; **3.** uzun vaxt / müddət, əbədi; **~s ago** çoxdan, lap çoxdan; *I have not seen you for ages Mən səni / sizi lap çoxdan görməmişəm;* **4.** qocalıq; taqətsizlik; **the wisdom of ~** qocalığın müdrikliyi; **from youth to ~** cavanlıqdan qocalığa qədər; **the infirmities of ~** qocalıq xəstəlikləri
**age²** [eɪdʒ] *v (pr.p* **aging** *və ya* **ageing;** *pp* **aged** [eɪdʒd]) **1.** qocaltmaq; **2.** qocalmaq; *He's aging /ageing fast O, sürətlə qocalır*
**aged** [eɪdʒd] *adj* **1.** qoca, qocalmış, çox qoca, pirani; **an ~ man/woman** qoca kişi /qadın; **his ~ parents** onun qoca/qocalmış valideynləri; **2.** yaşlı; **a girl ~ fifteen** on beş yaşlı qız; **3.** qocalıq; **~ wrinkles** qocalıq qırışları; **4. the ~** *top. i* qocalar; *The aged need our help Qocaların bizim köməyimizə ehtiyacı var*
**ageing** [ˈeɪdʒɪŋ] *n* **1.** yetişmə, yetirmə; **~ of wine** şərabın yetişməsi; **2.** keyfiyyətin pisləşməsi
**ageless** [ˈeɪdʒlɪs] *adj* **1.** qocalmayan, həmişəcavan; **2.** əbədi
**agelessness** [ˈeɪdʒlɪsnɪs] *n* qocalıq; piranilik
**agelong** [ˈeɪdʒlɔŋ] *adj* **1.** əsrlik, yüzillik; **2.** çox qədim / köhnə; **~ dream** lap çoxdankı/çox qədim arzu; **~ tradition** çox qədim / çox köhnə adət
**agency** [ˈeɪdʒənsɪ] *n* **1.** agentlik; nümayəndəlik; **tourist ~** turizm agentliyi/nümayəndəliyi; *This firm has agencies all over the world Bu firmanın dünyanın hər yerində nümayəndəliyi var;* **2.** vasitəçilik; **by/through the ~ of *smb.*** bir kəsin vasitəçiliyi ilə; **3.** güc; amil, faktor; **~ of destruction** dağıdıcılıq gücü/faktoru; **4.** *arx.* vasitə; güc; köməyilə; *Iron is melted by the agency of heat Dəmir istinin vasitəsi / gücü ilə əridilir*
**agenda** [əˈdʒendə] *n* gündəlik, gündəlik məsələ *(iclasda və s.)*; **an item on the ~** gündəlikdə duran məsələ; **the ~ as it stands** gündəlik məsələdə olduğu kimi; **to adopt the ~** gündəliyi qəbul etmək
**agennesis** [ˌædʒəˈniːsɪs] *n tib.* sonsuzluq, doğmazlıq, doğmama; cinsi gücsüzlük
**agent** [ˈeɪdʒənt] *n* **1.** agent, nümayəndə; vasitəçi; vəkil; **commercial ~** ticarət nümayəndəsi; **travelling ~** *amer. d.d.* turizm işləri üzrə agent; **to act as *smb.'s* ~** bir kəsin vəkili kimi hərəkət etmək; **2.** səbəb, amil, faktor; vasitə; *Rain and sun are the agents which help plants to grow Yağış və günəş bitkiləri inkişaf etdirən vasitədir / faktordur;* **3.** xəfiyyə, casus; **secret-service ~** casus, gizli xəfiyyə; **4.** *hərb.* zəhərləyici maddə
**agent-provocateur** [əˈʒaːŋprəˌvɔkəˈtəːʳ] *n fr. (pl* **agents-provocateurs** [əˈʒaːŋprəˌvɔkəˈtəːz]) provokator, təhrikçi, araqarışdıran, fitnəçi, fitnəkar
**age-old** [ˈeɪdʒˈould] *adj* qədim, çoxillik; çox qədim, çox köhnə; **~ dream of men** insanların çoxəsrlik/çoxillik arzusu; **~ traditions of nations** millətlərin qədim / çox köhnə adətləri



**agglutinate¹** [əˈgluːtɪnɪt] *adj* **1.** yapışdırılmış, yapışan; **2.** *dilç.* aqqlütinativ; **~ languages** aqqlütinativ dillər
**agglutinate²** [əˈgluːtɪneɪt] *v* **1.** yapışdırmaq, birləşdirmək; **2.** yapışmaq, birləşmək; **3.** yapışqana dönmək / çevrilmək; **4.** *dilç.* aqqlütinativ keyfiyyət kəsb etmək
**agglutination** [əˌgluːtɪˈneɪʃn] *n* **1.** yapışma, **2.** *dilç.* aqqlütinasiya; **3.** *tib.* bitişmə *(yaranın qıraqları)*
**agglutinative** [əˈgluːtɪnətɪv] *adj* **1.** yapışqanlı, yapışan; **2.** *dilç.* aqqlütinativ; **~ language** aqqlütinativ dil
**aggravate** [ˈægrəveɪt] *v* kəskinləşdirmək, ağırlaşdırmaq, pisləşdirmək; çətinləşdirmək; **to ~ an illness** xəstəliyi kəskinləşdirmək/ağırlaşdırmaq; **2.** əsəbiləşdirmək, acıqlandırmaq; *If you aggravate me any more, I'll hit you Sən/Siz məni bir də əsəbiləşdirsən/əsəbiləşdirsəniz, səni /sizi vuracam;* **3.** *hüq.* ağırlaşdırmaq *(günahı)*
**aggravating** [ˈægrəveɪtɪŋ] *adj* **1.** pisləşən, dərinləşən; **~ circumstances** pisləşən vəziyyət / şərait; **2.** əsəbiləşdirən; dilxorluq törədən, qanqaraldan
**aggravation** [ˌægrəˈveɪʃn] *n* **1.** pisləşmə, xarablaşma; ağırlaşma; **~ of guilt** günahın / suçun ağırlaşması; **the ~ of situation** vəziyyətin ağırlaşması/pisləşməsi; **2.** ağırlaşdırıcı vəziyyət; **3.** *arx.* şişirtmə, böyütmə, artırma
**aggravator** [ˈægrəveɪtəʳ] *n* **1.** qıcıqlandırıcı; **2.** ağırlaşdırıcı vəziyyət
**aggregate¹** [ˈægrɪgət] *n* **1.** cəm, yekun, məcmu, tam, bütöv; **in the ~** bütövlükdə; **2.** *tex.* aqreqat *(bir iş görmək üçün bir neçə müxtəlif maşın birləşməsindən ibarət qurğu)*
**aggregate²** [ˈægrɪgət] *adj* **1.** birləşmiş, ümumi, müştərək; **2.** ümumi; **~ membership** üzvlərin ümumi sayı; **~ forces** müştərək qüvvələr
**aggregate³** [ˈægrɪgeɪt] *v* **1.** bir yerə toplamaq, birləşdirmək; **2.** ümumilikdən ibarət olmaq
**aggregation** [ˌægrɪˈgeɪʃn] *n* **1.** hissələrin birləşməsi; **2.** konqlomerat *(müxtəlif şeylərin və hissələrin nizamsız yığını, birləşməsi)*
**aggregative** [ˈægrɪgeɪtɪv] *adj* ümumi, birləşmiş, müştərək, birgə
**aggression** [əˈgreʃn] *n* **1.** təcavüz, təcavüzkarlıq; **direct ~** birbaşa təcavüz; **indirect ~** dolayısı ilə /bilavasitə təcavüz; **war of ~** təcavüzkar müharibə, təcavüzkarlıq müharibəsi; **2.** bir kəsin hüquqlarını/imtiyazlarını məhdudlaşdırma/boğma
**aggressive** [əˈgresɪv] *adj* **1.** aqressiv, təcavüzkar; **~ war** təcavüzkar müharibə; **~ policy** təcavüzkar siyasət; **2.** fəal, aktiv; təsirli; **~ defence** *hərb.* aktiv/fəal müdafiə; **3.** inadlı, təkidli, israrlı, səbatlı; **an ~ man** inadlı / səbatlı adam; **~ tone** təkidli ton *(səs)*; **4.** hücum üçün istehsal edilmiş *(silah haq.)*
**aggressively** [əˈgresɪvlɪ] *adv* **1.** təcavüzkarcasına, təcavüzkarlıqla, təcavüzkar bir tərzdə / surətdə; **2.** təkidlə, israrla, inadla
**aggressiveness** [əˈgresɪvnɪs] *n* təcavüzkarlıq
**aggressor** [əˈgresəʳ] *n* **1.** təcavüzkar; **potential ~** potensial təcavüzkar; **2.** hücum edən tərəf; bais, təhrik edən, ilk başlayan
**aggrieved** [əˈgriːvd] *adj* **1.** incidilmiş, küsdürülmüş, təhqir edilmiş, könlü sındırılmış; **2.** *hüq.* ziyan çəkmiş, ziyana düşmüş
**agile** [ˈædʒaɪl] *adj* zirək, çevik, diri; qıvraq, cəld; **~ wit** çevik/iti ağıl; **as ~ as a squirrel** dələ kimi çevik /zirək /cəld
**agility** [əˈdʒɪlɪtɪ] *n* cəldlik, çeviklik; diribaşlıq, zirəklik
**agitate** [ˈædʒɪteɪt] *v* **1.** həyəcanlandırmaq, əsəbiləşdirmək, təşvişə salmaq, narahat etmək; **2.** həyəcanlanmaq, narahat olmaq, təşvişə düşmək; **to be deeply ~d about *smth.*** bir şey haqqında bərk / dərin təşviş keçirmək/həyəcanlanmaq / narahat olmaq; **3.** müzakirə etmək, ciddi tənqid etmək; **4.** təşviqat aparmaq; **to ~ for *smth.*** bir şeyin lehinə/xeyrinə təşviqat aparmaq; **to ~ against *smth.*** bir şeyin əleyhinə təşviqat aparmaq; **5.** qızışdırmaq; **6.** çalxalamaq, çalxalayıb qarışdırmaq; **7.** silkələmək; yelləmək; **to ~ *one's* hat** papağını yelləmək, **to ~ *one's* flag** bayrağını yelləmək; **8.** *arx.* qəsdində olmaq *(bir şeyin)*
**agitated** [ˈædʒɪteɪtɪd] *adj* həyəcanlı, əsəbi, əsəbiləşdirilmiş, həyəcanlandırılmış; narahat
**agitation** [ˌædʒɪˈteɪʃn] *n* **1.** həyəcan, çaxnaşma, təşviş, narahatlıq; vəlvələ, təlatüm, gərginlik, təlaş; **nervous ~** əsəb gərginliyi; **visible ~** görünən/zahiri təşviş; **inner ~** daxili həyəcan /təşviş/narahatlıq; **to keep in ~** həyəcan/təlaş/vəlvələ içərisində saxlamaq; **to express ~** həyəcan/təşviş ifadə etmək; **to provoke/to produce ~** vəlvələ/təşviş/narahatlıq yaratmaq; *The sea is in agitation after a storm Tufandan sonra dəniz təlatümlüdür;* **2.** açıq müzakirə; **preliminary ~** ilkin /açıq müzakirə; **widespread ~** geniş müzakirə; **3.** təşviqat; **to carry on ~ for *smth.*** bir şeyin lehinə təşviqat aparmaq; **to carry on ~ against *smth.*** bir şeyin əleyhinə təşviqat aparmaq
**agitator** [ˈædʒɪteɪtəʳ] *n* təşviqatçı
**ago** [əˈgou] *adv* əvvəl, bundan əvvəl/qabaq; **many years ~** çox illər əvvəl/bundan əvvəl/qabaq; **long ~** çox əvvəllər; **not long ~** bir az bundan əvvəl/qabaq, bu günlərdə, yaxınlarda; *How long ago did he leave? O neçə müddət bundan əvvəl getdi?*
**agonize** [ˈægənaɪz] *v* **1.** güclü / bərk əzab çəkmək, əzab içində qıvrılmaq; **2.** əzab vermək; **3.** var qüvvəsilə çalışmaq/mübarizə aparmaq
**agonized** [ˈægənaɪzd] *adj* kədərli, əzablı, üzücü; kədər dolu; **~ cry** kədərlə dolu hönkürtü
**agonizing** [ˈægənaɪzɪŋ] *adj* əzablı, əziyyətli, üzücü

**agony** [ˈægənɪ] *n* **1**. əzab, əziyyət; iztirab; **2**. ölüm əzabı; **the ~ / agonies of death** ölüm əzabları; *I suffered agonies of doubt Şübhələr məni didirdi; I suffered agonies of toothache Diş ağrısı məni öldürürdü*

**agrarian**[1] [əˈgrerɪən] *n* aqrar *(iri mülkədar)*, iri torpaq sahibi

**agrarian**[2] [əˈgreərɪən] *adj* aqrar, torpağa və əkinçiliyə aid olan; **~ laws/reforms** aqrar qanunlar / islahatlar

**agree** [əˈgri:] *v* **1**. razılaşmaq, razı olmaq; **to ~ with** ***smb.*** bir kəslə razılaşmaq; *He agreed with me O, mənimlə razılaşdı; They will never agree Onlar heç vaxt razılaşmayacaqlar/razı olmayacaqlar; The workers agreed with the government's plan Fəhlələr hökumətin planı ilə razılaşdılar;* **2**. razılaşdırılmaq; **the principles ~d upon** razılaşdırılmış prinsiplər; **3**. razılığa gəlmək; **to ~ on/as to** ***smth.*** bir şey barədə razılığa gəlmək; **to ~ to do** ***smth.*** bir iş görmək üçün razılığa gəlmək/razılaşmaq; **4**. yola getmək /gəlmək; razılıq şəraitində yaşamaq; *The children can never agree Uşaqlar heç vaxt yola getmirlər;* **5**. müvafiq gəlmək, həmahəng olmaq; **to ~ with facts** faktlara müvafiq olmaq /gəlmək; **to ~ with original** orijinala müvafiq olmaq/gəlmək; **6**. *qram.* uzlaşmaq; *In English the predicate agrees with the subject İngilis dilində xəbər mübtəda ilə uzlaşır;*

◊ **to ~ like dog and cat** *at. söz.* it-pişik kimi yaşamaq *(yəni yola getməmək)*

**agreeability** [ə.grɪəˈbɪlɪtɪ] *n* xoşluq, xoşhallıq, yaxşılıq *(xüs. rəftarda)*

**agreeable** [əˈgrɪəbl] *adj* **1**. xoşagələn, xoşagedən, zövqverən, səfalı, sevindirici, fərəhləndirici; **~ person** xoşagələn/xoşsifət adam; **an ~ voice** xoş/xoşagələn səs; **~ weather** xoşagedən /nəşəverən/xoş hava; **to make oneself ~ to** ***smb.*** bir kəsə xoş gəlməyə çalışmaq; **2**. *d.d.* razı; **to be ~ to** ***smth.*** bir şeylə razılaşmaq; *I'm quite agreeable Mənim etirazım yoxdur;* **3**. qəbul edilə bilən, qəbul edilən, müvafiq; tələbə müvafiq;

◊ **to do the ~** razı salmaq, xoşuna gəlməyə çalışmaq

**agreeably** [əˈgrɪəblɪ] *adv* **1**. xoş, yaxşı, gözəl; çox yaxşı, mehribanlıqla, xoş sifətlə; **2**. müvafiq olaraq, müvafiq, uyğun, uyğun olaraq, müvafiq surətdə; **~ to my instructions** mənim göstərişimə müvafiq /uyğun olaraq

**agreement** [əˈgri:mənt] *n* **1**. razılaşma, uzlaşma; razılıq; **to come to an ~ on/about** ***smth.*** **with** ***smb.*** bir şey barədə/haqqında bir kəslə razılığa gəlmək; **to reach ~** razılıq əldə etmək, razılığa nail olmaq; **2**. saziş, müqavilə; **collective ~** birgə saziş/müqavilə; **stand-still ~** xüsusi borclara görə qadağa/moratorium; *You have broken our agreement Sən/Siz bizim müqaviləmizi pozubsan/pozubsunuz;* **armistice ~** sülh/barışıq müqaviləsi; **cultural exchange ~** mədəniyyət mübadiləsi müqaviləsi/sazişi; **disarmament ~** tərksilah üzrə müqavilə; **to come to an ~** razılığa gəlmək; **3**. razılıq; birlik; **by mutual ~** qarşılıqlı razılıq əsasında; **~ of opinion** fikir birliyi; **to be in ~ with** ***smb.*** bir kəslə razılaşmaq; **4**. *qram.* uzlaşma; **~ between the subject and the predicate** mübtəda və xəbər arasında uzlaşma, mübtəda ilə xəbərin uzlaşması

**agricultural** [.ægrɪˈkʌltʃərəl] *adj* kənd təsərrüfatı; **~ labourers** kənd təsərrüfatı işçiləri; **~ show** kənd təsərrüfatı sərgisi; **~ engineering** kənd təsərrüfatı üçün maşınqayırma; **~ experiment(al) station** kənd təsərrüfat təcrübə stansiyası; **~ implements** kənd təsərrüfat alətləri / inventarları / avadanlıqları; **~ adviser** kənd təsərrüfatı üzrə məsləhətçi

**agriculturalist** [.ægrɪˈkʌltʃərəlɪst] *n* = **agriculturist**

**agriculturally** [.ægrɪˈkʌltʃərəlɪ] *adv* kənd təsərrüfatı baxımından

**agriculture** [ˈægrɪkʌltʃə$^{r}$] *n* kənd təsərrüfatı; əkinçilik; **Board of Agriculture** Kənd Təsərrüfatı Nazirliyi *(İngiltərədə)*

**agriculturer** [.ægrɪˈkʌltʃərə$^{r}$] *n arx.* = **agriculturist**

**agriculturist** [.ægrɪˈkʌltʃərɪst] *n* **1**. aqronom; **2**. fermer, əkinçi

**agrobiologic** [ˈægrou.baɪələdʒɪk] *adj* aqrobioloji

**agrobiological** [ˈægrou.baɪəˈlɔdʒɪkəl] *adj* = **agrobiologic**

**agrobiology** [.ægroubaɪˈɔlədʒɪ] *n* aqrobiologiya

**agrologic** [.ægrouˈlɔdʒɪk] *adj* aqroloji, torpaqşünaslığa aid olan

**agrological** [.ægrouˈlɔdʒɪkəl] *adj* = **agrologic**

**agrology** [əˈgrɔlədʒɪ] *n* aqrologiya, torpaqşünaslıq

**agronome** [ˈægrənoum] *n* = **agronomist**

**agronomist** [əˈgrɔnəmɪst] *n* aqronom

**agronomy** [əˈgrɔnəmɪ] *n* **1**. aqronomiya; əkinçilik; **2**. əkinçilik və kənd təsərrüfatı haqqında elm; əkinçilik və kənd təsərrüfatı sahəsində görülən əməli işlər

**aha** [aˈha:] *inter* aha(a) *(heyrət, təəccüb və s. bildirən nida)*

**ahead** [əˈhed] *adv* irəli, qabağa; qabaqcadan, qabaqdakı, irəlicədən; **to look ~ 1)** irəli / qabağa baxmaq; **2)** gələcəyə hazır olmaq; **to go ~** əvvəlcədən/qabaqcadan getmək; *One man went ahead to see if the road was clear Bir adam əvvəlcədən / qabaqcadan getdi ki, görsün yol təmizdirmi;* **road ~** qabaqdakı yol; *The road ahead was full of animals Qabaqdakı yol heyvanlarla dolu idi;* **to plan ~** əvvəlcədən /qabaqcadan planlaşdırmaq; *We planned ahead everything Biz hər şeyi qabaqcadan / əvvəlcədən planlaşdırdıq;*

◊ *Go ahead! d.d. Davam et, İrəli! Full speed*



*ahead! dan. Tam sürətlə irəli!* **~ of time** vaxtından əvvəl; **to get ~** irəliləmək, müvəffəqiyyət qazanmaq, müvəffəq olmaq; **to get ~ of** ***smb.*** bir kəsdən irəlidə / qabaqda olmaq, bir kəsə üstün gəlmək, bir kəsi qabaqlamaq

**Ahriman** [ˈa:rɪmən] *n əsr.* Əhrimən *(fars əsatirinə görə şər allahı)*

**aid**[1] [eɪd] *n* **1**. yardım, kömək; müdafiə, müdafiə etmə/edilmə; **first ~** ilk / birinci yardım /kömək; **to give first ~** ilk / təcili/birinci yardım /kömək göstərmək; **to render/to lend ~** kömək /yardım göstərmək, kömək etmək; **to come to the ~ of** ***smb.*** bir kəsə köməyə gəlmək, bir kəsə kömək etmək/göstərmək; *He came to the aid of the hurt man O, yaralanmış/zədə almış kişinin köməyinə gəldi;* **~ and comfort** *hüq.* kömək və müdafiə; **2**. köməkçi; **my chief ~ in business** biznesdə/işdə mənim əsas köməkçim; *A dictionary is an important aid in learning a new language Yeni dil öyrənməkdə lüğət vacib köməkçidir;* **3**. *pl* köməkçi vasitə; vəsait; **training ~s** dərs vəsaitləri; **visual ~s** əyani vəsaitlər; **4**. *pl hərb.* köməkçi ordu; **5**. *tar.* krala verilən maliyyə yardımı/pul köməyi/maddi yardım;

◊ **in ~ of** nə fayda; nə üçün? *What is this little handle in aid of? It is for starting the machine Bu balaca dəstək nə üçündür? O, maşını işə salmaq üçündür*

**aid**[2] [eɪd] *v* yardım/kömək etmək; köməklik /yardım göstərmək; **to ~ a poor family** kasıb ailəyə kömək/yardım etmək, kasıb ailəyə kömək/ yardım göstərmək; **to ~** ***smb.*** **to do** ***smth.*** bir iş görməkdə kiməsə kömək etmək/göstərmək

**aidful** [ˈeɪdful] *adj arx.* = **helpful**

**aidless** [ˈeɪdlɪs] *adj* **1**. yardım/kömək olmadan, köməksiz, yardımsız; **2**. təkbaşına; **3**. faydasız, köməyi dəyməyən; **~ medicine** faydasız dərman / dava

**aid-man** [ˈeɪdmæn] *n* (*pl* **-men**) [-mən] *hərb. d.d.* sanitar *(qoşunda yaralı daşıyan əsgər)*

**ail**[1] [eɪl] *n arx.* xəstəlik, naxoşluq, azar

**ail**[2] [eɪl] *v* **1**. naxoşlamaq, xəstələnmək, azarlamaq, naxoşluq /xəstəlik hiss etmək; *She is ailing O, xəstədir / naxoşdur;* **2**. narahat etmək, dərd/azar vermək, əziyyət vermək; *What ails him? Onu nə incidir? Onu nə narahat edir? Ona nə əziyyət verir? What ails your eyes? Sənin/ Sizin gözünə / gözünüzə nə olub?*

**ailing** [ˈeɪlɪŋ] *adj* xəstə, naxoş, azarlı, nasaz

**ailment** [ˈeɪlmənt] *n* xəstəlik, naxoşluq, kefsizlik, nasazlıq, əzginlik; **hereditary/chronic/incurable /grave ~** irsi / xroniki / sağalmaz / ağır xəstəlik; **to diagnose/to cure ~** xəstəliyi müəyyənləşdirmək / müalicə etmək

**aim**[1] [eɪm] *n* **1**. məqsəd, niyyət, murad, məram, arzu, plan; **noble ~** nəcib məqsəd / niyyət / arzu; ***one's*** **~ in life** bir kəsin həyatda məqsədi /niyyəti/ muradı / arzusu / məramı; **ambitious ~** qərəzli niyyət / məqsəd / plan; **sinister ~** nəhs / məşum niyyət / məqsəd / plan; **sordid ~** alçaq / rəzil məqsəd / niyyət / plan; **to gain / to attain** ***one's*** **~** öz məqsədinə / niyyətinə / məramına / muradına çatmaq; *What is your aim in working so hard Sənin/Sizin belə ciddi işləməkdə məqsədin/məqsədiniz nədir? He has only one aim in life – to make a fortune Onun həyatda bircə məqsədi var – dövlət toplamaq;* **2**. nişan, hədəf; **to miss** ***one's*** **~** hədəfi / nişanı vura bilməmək, hədəfə düşə bilməmək; **to take ~ at** ***smth.*** bir şeyi nişan almaq / hədəfə götürmək; **to take ~ at** ***smb.*** bir kəsi nişan almaq / hədəfə götürmək; **to take a good / unerring ~** sərrast nişan almaq / düz hədəfə düşmək / dəymək; **to take careful ~** diqqətlə / səliqə ilə nişan almaq; **to take careful ~ at the target** hədəfi diqqətlə / səliqə ilə nişan almaq; *The hunter took a careful aim at the wolf Ovçu canavarı dəqiq nişan aldı*

**aim**[2] [eɪm] *v* **1**. nişan almaq, hədəfə götürmək/ almaq; **to ~ at** ***smb.*****/at** ***smth.*** bir kəsi / şeyi hədəfə götürmək, bir kəsi / şeyi nişan almaq; **to fire without ~ing** nişan almadan atəş açmaq; **2**. yönəltmək, cəhd etmək; **to ~** ***one's*** **efforts at** ***smth.*** bir şeyə səy göstərmək, səyini bir şeyə yönəltmək; **to ~ satire/criticism at** ***smb.*** tənqidi /satiranı bir kəsə yönəltmək; **3**. cəhd/səy etmək, cəhd / səy göstərmək, can atmaq; **to ~ to do** ***smth.*** bir şeyi etməyə cəhd etmək / səy göstərmək; **to ~ at perfection/at being perfect** kamilliyə /kamil olmağa can atmaq; **4**. atmaq, tullamaq; qımçırlamaq; **to ~ a book at** ***smb.*** bir kəsin üstünə kitab qımçırlamaq; **to ~ a stone at** ***smb.*** bir kəsin üstünə daş qımçırlamaq, bir kəsə daş atmaq; **5**. işarə vurmaq, nəzərdə tutmaq; yuxarıdan getmək; *He's aiming high O, çox yuxarıdan gedir;* **to ~ above** ***smth.*** yuxarı nişan almaq; *I am not aiming at you Mən sizi nəzərdə tutmuram;*

◊ **to ~ at, to ~ for** bir işin yerinə yetirilməsinə səy göstərmək / cəhd etmək; *The factory must aim at increasing production Fabrik məhsulu artırmağa səy göstərməlidir / cəhd etməlidir*

**aimed** [eɪmd] *adj* nişan alınmış, tuşlanmış; **~ fire** nişana alınmış / tuşlanmış atəş; **~ shot** tuşlanmış atəş

**aimful** [ˈeɪmful] *adj arx.* müəyyən məqsədə doğru yönəlmiş, aydın məqsədi olan

**aimless** [ˈeɪmlɪs] *adj* məqsədsiz, məramsız, niyyətsiz

**aimlessly** [ˈeɪmlɪslɪ] *adv* məqsədsiz, niyyətsiz; faydasız; **to speak ~** məqsədsiz danışmaq

**aimlessness** [ˈeɪmlɪsnɪs] *n* məqsədsizlik, niyyətsizlik, amalsızlıq

**air**[1] [eə$^{r}$] *n* **1**. hava; atmosfer; **fresh ~** təmiz hava; **night ~** gecə havası; **stale ~** üfunətli/pis hava; **winter ~** qış havası; **in the open ~** açıq havada; **to take the air 1)** təmiz hava almaq, təmiz hava ilə nəfəs almaq; **2)** havaya qalxmaq *(təyyarə və s.)*;

by ~ təyyarə ilə; **to travel by** ~ təyyarə ilə səyahət etmək; **to command the** ~ havada hakim olmaq, havada hakimlik etmək; **to be in the** ~ **1)** havadan asılı qalmaq; dəqiq olmamaq; *Still we may be going skiing, but it is all up in the air Biz, ola bilsin ki, xizəklə sürüşməyə gedək, amma bu hələ dəqiq deyil;* **2)** yayılmaq, gəzmək; *Rumours are in the air Şayiələr gəzir / yayılır*; **a shot in the** ~ təvəkkülə / havaya atılan atəş; **to be on the** ~ radio ilə verilmək, radio ilə çıxış etmək; *The President will be on the air tonight Prezident bu axşam radio ilə çıxış edəcək;* **to put** ***smth.*** **on the** ~ bir şeyi radio ilə vermək/yaymaq; **to get on the** ~ **to** ***smb.*** bir kəslə radio vasitəsi ilə əlaqə saxlamaq/ əlaqəyə girmək; *What is on the air? Radio proqramında nə var? Radio ilə nə yayımlanır?;* **2.** atmosfer, vəziyyət; şərait; **friendly** ~ dostluq şəraiti; **hostile** ~ düşmənçilik şəraiti; **a change of** ~ vəziyyətin/şəraitin dəyişməsi; **to clear the** ~ **1)** havanı dəyişmək *(otağın və s.)*; **2)** şəraiti yaxşılaşdırmaq; vəziyyətdəki gərginliyi zəiflətmək; 3. meh, xəfif yel; 4. görünüş, sifətin ifadəsi; davranış; **with an** ~ **of importance** təşəxxüslü/vüqarlı/görkəmli görünüş; **with a decisive** ~ qətiyyətli görkəmlə; 5. *pl* iddia /təşəxxüs satma; lovğalanma; naz-qəmzə, işvə, işvə satma; **~s and graces** naz-qəmzə, işvə, naz/işvə satma; **to give oneself ~s** naz/qəmzə/işvə satmaq, lovğalanmaq; 6. hava, ariya, mahnı, melodiya; 7. açıqlıq, aşkarlıq, məşhurluq; **to take** ~ hamıya tanış olmaq, aşkarlıq qazanmaq; **to give** ~ **to a plan** planı aşıkar etmək /aşkarlamaq;

◊ **castles in the** ~ havada qəsr, xam xəyal; **to build castles in the** ~ havada qəsr tikmək, dəryada balıq sövdası etmək; **hot** ~ *amer.* boş danışıq, gop; lovğalıq, gopçuluq; **to vanish / to melt into thin** ~ izsiz-tozsuz qeyb olmaq/yoxa çıxmaq

**air[2]** [eəʳ] *adj* 1. hava; hava ilə doldurulmuş; ~ **travel/traffic** hava səyahəti/nəqliyyatı; ~ **sports** aviasport, hava idmanı; ~ **offensive** hava hücumu; ~ **passage** hava keçidi / kanalı; ~ **navigation** hava naviqasiyası; ~ **boat** hava ilə doldurulmuş qayıq; 2. pnevmatik; ~ **valve** pnevmatik qapaq; ~ **thermometer** pnevmatik termometr

**air[3]** [eəʳ] *v* 1. havasını dəyişmək; **to** ~ **the room** otağın havasını dəyişmək; 2. qurutmaq; 3. göstərmək, faş etmək, hamıya bildirmək; **to** ~ ***one's*** **opinions** öz fikrini faş etmək /hamıya bildirmək; **to** ~ ***one's*** **theories** öz nəzəriyyələrini açıq bildirmək/faş etmək; *He constantly airs his stupidity O həmişə öz səfehliyini faş edir / büruzə verir*

**air-bag** [ˈeəbæg] *n* hava ilə doldurulmuş rezin qayıq

**air-balloon** [ˌeəbəˈlu:n] *n* hava şarı; aerostat

**air-base** [ˈeəbeɪs] *n av.* təyyarə bazası

**air-bed** [ˈeəbed] *n* hava ilə doldurulmuş döşək

**air-bladder** [ˈeəˌblædəʳ] *n* 1. üzgəc *(balıqda)*; 2. hava qabarcığı *(şüşədə)*

**air-box** [ˈeəbɔks] *n* hava kamerası

**air-brake** [ˈeəbreɪk] *n tex.* hava əyləci / tormozu, pnevmatik əyləc / tormoz

**air-brick** [ˈeəˌbrɪk] *n tex.* içi boş *(deşikli)* kərpic

**air-bridge** [ˈeəbrɪdʒ] *n* hava körpüsü

**air-bus** [ˈeəbʌs] *n* yaxın məsafəyə adam daşıyan böyük təyyarə

**air-built** [ˈeəbɪlt] *adj* heç bir şeyə əsaslanmayan, xülya, xəyala gətirilmiş, fantastik

**air-castle** [ˈeəˌka:sl] *n* uydurma şey, fantaziya

**air-cell** [ˈeəsel] *n* 1. *anat.* ciyər yuvağı; 2. yumurtada hava kamerası *(boşluğu)*

**air-chamber** [ˈeəˌtʃeɪmbəʳ] *n tex.* hava kamerası

**air-channel** [ˈeəˌtʃænl] *n tex.* hava kanalı; havadəyişən boru

**air-chute** [ˈeəʃu:t] *n* paraşüt

**air-cooled** [ˈeəku:ld] *adj* hava ilə soyudulmuş

**air-cooler** [ˈeəˌku:ləʳ] *n* hava soyuducusu, hava radiatoru

**air-cooling** [ˈeəˌku:lɪŋ] *n tex.* hava vasitəsi ilə soyudulma; havanın soyudulması

**aircraft[1]** [ˈeəkra:ft] *n* təyyarə; *top.i* təyyarələr; aviasiya; uçan aparat

**aircraft[2]** [ˈeəkra:ft] *adj* təyyarə; aviasiya; uçan aparat

**aircraftman** [ˈeəkra:ftmən] *n (pl* **-men** [-mən]) aviasiyanın sıravi əsgəri

**aircrew** [ˈeəkru:] *n* təyyarə heyəti/ekipajı

**aircrewman** [ˈeəkru:mən] *n (pl* **-men** [-mən]) təyyarə heyətinin üzvü

**air-cushion** [ˈeəˌkuʃn] *n* 1. hava ilə doldurulmuş yastıq/balış; 2. pnevmatik amortizator

**air-defense** [ˈeədɪˈfens] *n hərb.* hərbi hava müdafiəsi; HHM

**air-drain** [ˈeədreɪn] *n tex.* nəfəslik, buxarkeş

**airdrome** [ˈeədroum] *n* aerodrom *(təyyarə meydanı)*

**airdrop[1]** [ˈeədrɔp] *n* 1. təyyarədən atma / tökmə *(sursat, vərəqə və s.)*; 2. desant tökmə

**airdrop[2]** [ˈeədrɔp] *v* təyyarədən atmaq / tökmək *(sursat, vərəqə və s.)*

**air-engine** [ˈeərˌendʒɪn] *n* təyyarə mühərriki

**air-field** [ˈeəfi:ld] *n* = **airdrome**

**Air Force** [ˈeəˈfɔ:s] *n hərb.* hərbi hava qüvvələri

**airfree** [ˈeəfrɪ:] *adj tex.* havasız; vakuumlu

**airfreighter** [ˈeəˌfreɪtəʳ] *n* yük təyyarəsi

**air-gun** [ˈeəgʌn] *n* 1. pulverizator *(mayeni toz halında fısqırtmaq üçün cihaz)*; 2. *tex.* aerologiya *(atmosferin yuxarı qatlarında olan prosesləri öyrənən elm)*

**air-hammer** [ˈeəˌhæməʳ] *n* 1. *tex.* hava çəkici, pnevmatik çəkic; 2. kömürsındıran çəkic

**air-highway** [ˈeəˌhaɪweɪ] *n* hava yolu

**air-hole** [ˈeəhoul] *n* 1. nəfəslik; buxarkeş *(ocaqda, buxarıda)*; 2. külbə *(təndirdə, ocaqda)*; 3. çörəyin, pirojnanın içində havadan əmələ gələn boşluq

**air-hostess** [ˈeəˌhoustɪs] *n* styüardessa *(təyyarədə sərnişinlərə xidmət edən qadın/ qız)*



**airily** [ˈeərɪlɪ] *adv* 1. yüngül, hava kimi; 2. yüngül, düşüncəsiz; 3. şən, şad, qayğısız

**airiness** [ˈeərɪnɪs] *n* 1. yüngüllük, çəkisizlik; 2. şənlik, qayğısızlıq; 3. yüngüllük, yelbeyinlik, hərdəmxəyallıq

**airing** [ˈeərɪŋ] *n* 1. havasını təmizləmə / dəyişmə, havaya vermə / verilmə və qurudulma; **to give an** ~ **to** ***smth.*** bir şeyi yaxşı-yaxşı havaya vermək/qurutmaq; 2. gəzinti, gəzmə, seyr, ayaqseyri; **to take an** ~, **to go for an** ~ gəzintiyə çıxmaq / getmək, seyrə / ayaqseyrinə çıxmaq; 3. *tex.* ventilyasiya *(havanı dəyişmə)*

**air-jacket** [ˈeəˌdʒækɪt] *n* hava ilə doldurulmuş xilasedici jaket

**air-jet** [ˈeədʒet] *n tex.* forsunka

**airless** [ˈeəlɪs] *adj* 1. küləksiz, sakit; 2. havasız; ~ **room** havasız otaq

**airline** [ˈeəlaɪn] *n* 1. hava yolu, təyyarə xətti; 2. hava nəqliyyatı kompaniyası

**air-liner** [ˈeəˌlaɪnəʳ] *n* reys təyyarəsi, hava layneri, nəqliyyat təyyarəsi

**airmail[1]** [ˈeəmeɪl] *n* aviapoçt, təyyarə poçtu

**airmail[2]** [ˈeəmeɪl] *v* təyyarə ilə göndərmək

**airman** [ˈeəmæn] *n (pl* **-men** [mən]) təyyarəçi, təyyarə sürən

**airmanship** [ˈeəmənʃɪp] *n* təyyarə sürmə sənəti

**air-map** [ˈeəmæp] *n* aeronaviqasiya xəritəsi

**air-marshal** [ˈeəˌma:ʃəl] *n* aviasiya marşalı

**air-mine** [ˈeəmaɪn] *n* aviasiya minası

**airometer** [eəˈrɔmɪtəʳ] *n* aerometr *(qazların və havanın çəki və sıxlığını ölçən cihaz)*

**air-pillow** [ˈeəˌpɪlou] *n* = **air-cushion**

**air-pipe** [ˈeəpaɪp] *n tex.* ventilyasiya borusu

**air-plane** [ˈeəpleɪn] *n amer.* təyyarə, aeroplan

**air-pocket** [ˈeəˌpɔkɪt] *n* 1. *av.* hava quyusu; 2. hava kisəsi, hava cibi *(borularda və s.)*

**air-port** [ˈeəpɔ:t] *n* aeroport, hava limanı

**airpost** [ˈeəpoust] *n* = **air-mail**

**air-proof** [ˈeəpru:f] *adj* havakeçirməyən; sıx, germetik

**air-pump** [ˈeəpʌmp] *n* 1. *tex.* hava nasosu; 2. velosiped üçün nasos

**air-raid** [ˈeəreɪd] *n* hava hücumu; ~ **shelter** hava hücumundan sığınacaq, bomba sığınacağı *(bombadan qorunmaq üçün xüsusi yer)*

**air-raider** [ˈeəˌreɪdəʳ] *n av.* hava basqınında iştirak edən təyyarə

**air scout** [ˈeəˈskaut] *n av.* kəşfiyyatçı təyyarə

**airscrew** [ˈeəskru:] *n* propeller, hava vinti

**airshed** [ˈeəʃed] *n* anqar *(təyyarələrin saxlanılması üçün xüsusi bina)*

**airship** [ˈeəʃɪp] *n* dirijabl, hava gəmisi

**air-show** [ˈeəʃou] *n* 1. aviasiya sərgisi; 2. əyani uçuş, nümayiş uçuşu

**airsick** [ˈeəsɪk] *adj*: **to be** ~ hava xəstəliyindən əziyyət çəkən *(yəni təyyarədə uçarkən başı fırlanan, ürəyi qalxan)*

**air-sickness** [ˈeəˌsɪknɪs] *n* hava xəstəliyi *(yəni təyyarədə uçarkən ürək bulanması, başgicəllənməsi)*

**air-space** [ˈeəspeɪs] *n* 1. fəza; 2. boşluq

**air-speed** [ˈeəspɪ:d] *n* 1. hava axınının sürəti; 2. uçuş sürəti

**air-stone** [ˈeəstoun] *n* meteorit *(fəzadan yerə düşən metal və ya daş kütlə)*

**air-stop** [ˈeəstɔp] *n* 1. vertolyot stansiyası; 2. minik meydanı

**airstream** [ˈeəstri:m] *n* hava axını

**air-strip** [ˈeəstrɪp] *n av.* uçma və enmə zolağı

**air-washer** [ˈeəˌwɔʃəʳ] *n tex.* havatəmizləyən *(aparat)*

**airway** [ˈeəweɪ] *n* 1. hava yolu, hava xətti; 2. aviasiya kompaniyası; **British Airways** Britaniya hava yolları kompaniyası; **Azerbaijan Airways** Azərbaycan hava yolları kompaniyası

**airwoman** [ˈeəˌwumən] *n (pl* **-women** [ˌwɪmɪn]) təyyarəçi qadın / qız, təyyarə sürən qadın / qız

**air-worthy** [ˈeəˌwə:ðɪ] *adj* uçuşa yararlı

**airy** [ˈeərɪ] *adj* 1. havalı, hava ilə dolu; ~ **room** havalı/havası çox olan otaq; 2. külək tutan; ~ **place** külək tutan yer; 3. yüngül, çəkisiz, boş; ~ **dress** yüngül paltar; ~ **plans** boş planlar; ~ **promises** boş vədlər; 4. incə, zərif; ~ **figure** incə / zərif fiqura; 5. şən, qayğısız; ~ **laughter** şən/qayğısız gülüş; 6. real olmayan, qeyri-real, uydurma; ~ **notions** uydurma təsəvvürlər; *Nothing results from his airy plans Onun boş/uydurma planlarından heç nə çıxan deyil*

**aitch** [eɪtʃ] *n* eyç (**H** *hərfinin adı)*

**ajar** [əˈdʒa:ʳ] *adv* yarıaçıq, yaxşı örtülməmiş; *The door is ajar Qapı aralıdır / yarıaçıqdır/ yaxşı örtülməyib*

**akin** [əˈkɪn] *adj* 1. qohum, doğma, qan qohumu; ~ **to** ***smb.*** bir kəsə qohum, bir kəsə qan qohumluğu olan; 2. eyni görünüşə malik olan, eyni görünüşü olan, bənzər, oxşar; ~ **to** ***smth.*** bir şeyə oxşar olan/ oxşayan; *His beautiful writing is akin to drawing Onun gözəl əlyazısı/xətti şəklə bənzəyir/oxşayır;* **an astonishment** ~ **to fear** qorxuya oxşar / bənzər heyrət

**-al** [əl] *aff. isimlərdən nisbi sifətlər düzəltmək üçün şəkilçi*: nation+al = **national** milli; politic+al = **political** siyasi *və s.*

**ala** [ˈeɪlə] *n (pl* **alae** [ˈeɪli:]) *anat., zool.* qanad, pər, qanadabənzər çıxıntı; **the ~e of the nose** burun pərləri

**alabaster** [ˈæləba:stəʳ] *n tex.* alebastr, gəc, kirəc

**alae** [ˈeɪli:] *n* **ala** *isminin cəm forması*

**alack** [əˈlæk] *n arx.* kədər ifadə edən ağlama, ağı

**alamode** [ˌa:ləˈmoud] *adj* 1. dəbdə olan; 2. *aşp.* tərəvəz ilə buğda bişirilmiş; **beef** ~ buğda tərəvəzlə bişirilmiş mal əti

**alarm[1]** [əˈla:m] *n* 1. həyəcan, təhlükə siqnalı, təhlükə haqqında xəbərdarlıq; **false** ~ yalançı həyəcan; **midnight** ~ gecə siqnalı; **to give / to raise the** ~ həyəcan qaldırmaq; 2. fit, fit səsi; **shrill** ~

keskin həyəcan doğuran fit / fit səsi; 3. *hərb.* hərbi həyəcan; silah götürməyə səsləyən həyəcan /çağırış; ~ **for instruction** təlim həyəcanı; 4. qorxu, vəlvələ, çaxnaşma, təlaş; **in** ~ qorxu / vəlvələ / çaxnaşma içərisində; *He jumped up in alarm O, həyəcan içərisində dik atıldı;* **to feel / to take** ~ qorxuya / vəlvələyə / çaxnaşmaya düşmək, həyəcan /təlaş keçirmək, həyəcanlanmaq

**alarm[2]** [ə'la:m] *v* **1.** həyəcan qaldırmaq, həyəcan siqnalı vermək; xəbərdarlıq etmək *(təhlükə haq.)*; **2.** *hərb.* həyəcan siqnalı ilə ayağa qaldırmaq, silaha sarılmağa çağırmaq; **to ~ the camp** düşərgəni həyəcan siqnalı ilə ayağa qaldırmaq; **to ~ for instruction** təlim vermək / öyrətmək üçün həyəcan siqnalı vermək; **3.** həyəcanlandırmaq, qorxuya/vəlvələyə/çaxnaşmaya salmaq; qorxutmaq; **to ~ the birds** quşları qorxuya salmaq; **to ~ profoundly/gravely** dərindən-/ciddi həyəcanlandırmaq; **to be ~ed by rumours** şayiələrdən həyəcan keçirmək/vəlvələyə düşmək; *Everybody was alarmed by the news Xəbər hamını vəlvələyə / çaxnaşmaya saldı*

**alarmable** [ə'la:mbl] *adj* tez həyəcanlanan; asanlıqla vəlvələyə / çaxnaşmaya düşən

**alarm-bell** [ə'la:mbel] *n* həyəcan / təhlükə siqnalı, fəlakət bildirən zəng

**alarm-clock** [ə'la:mklɔk] *n* zəngli saat

**alarmed** [ə'la:md] *adj* həyəcanlanmış, həyəcana salınmış, həyəcanlandırılmış; narahat edilmiş

**alarm-gun** [ə'la:mgʌn] *n* xəbərdarlıq topu

**alarming** [ə'la:mıŋ] *adj* **1.** həyəcanlı, səksəkəli; **2.** təhlükə bildirən, təhlükə xəbəri verən *(siqnal)*

**alarmism** [ə'la:mızm] *n* hay-küyçülük, küyçülük

**alarmist** [ə'la:mist] *adj* hay-küyçü, küyçü, çaxnaşma / vəlvələ salan

**alarm-post** [ə'la:mpoust] n *hərb.* həyəcan siqnalı ilə toplaşma yeri

**alarm-word** [ə'la:mwə:d] n *arx.* parol *(hərbi xidmətdə və ya gizli təşkilatlarda öz adamlarını tanımaq üçün şərti məxfi söz)*

**alary** ['eıləri] *adj bot. zool.* qanadşəkilli, qanadabənzər, qanadaoxşar, qanad kimi

**alas** [ə'la:s] *inter* heyhat, vaxsey; əfsus

**Albanian[1]** [æl'beınjən] *n* **1.** Arnaut, alban, albaniyalı, Albaniya vətəndaşı; **the ~s** *top.i* arnautlar; albanlar; **2.** arnaut / alban dili

**Albanian[2]** [æl'beınjən] *adj* arnaut, alban

**albatross** ['ælbətrɔs] *n zool.* albatros *(dəniz quşu)*

**albescent** [æl'besənt] *adj* ağtəhər, ağa çalan, ağa dönən

**albiness** ['æl'bi:nıs] *n biol.* albinos qadın/ qız

**albinism** ['ælbınızm] *n biol.* albinizm *(orqanizmdə piqment azlığı və bunun nəticəsində dəri və saçların həddindən artıq ağlığı)*

**albino** [æl'bi:nou] *n (pl* **-os** [ouz]) albinos *(albinizmə tutulmuş adam)*

**albinoism** [æl'bı:nouızm] *n* = **albinism**

**album** ['ælbəm] *n* albom

**albumen** ['ælbjumın] *n* **1.** yumurtanın ağı; **2.** *biol.* zülal, albumin

**albumen-free** ['ælbjumın'fri:] *adj biol.* zülalsız

**albumenize** [æl'bju:mınaız] *v* = **albuminize**

**albuminize** [æl'bju:mınaız] *v* zülal əlavə etmək

**albuminoid** [æl'bju:mınɔıd] *adj* zülalabənzər, zülalaoxşar

**alchemic** [æl'kemık] *adj* əlkimya

**alchemical** [æl'kemıkəl] *adj* = **alchemic**

**alchemist** ['ælkımıst]*n* əlkimyagər *(yalançı kimya ilə məşğul olan adam)*

**alchemistry** [æl'kemıstrı] *n d.d.* = **alchemy**

**alchemy** ['ælkımı] *n* əlkimya, yalançı kimya

**alcohol** ['ælkəhɔl] *n* **1.** spirt; **absolute** ~ təmiz spirt; **methyl** ~ ağac spirti; **2.** *kim.* etil spirti; **3.** alkoqol, spirtli içkilər

**alcoholic[1]** [,ælkə'hɔlık] *n* **1.** alkoqolik, içki düşkünü, əyyaş; **2.** *pl* spirtli içkilər, alkoqollu içkilər

**alcoholic[2]** [,ælkə'hɔlık] *adj* **1.** alkoqollu, spirtli; ~ **drinks** alkoqollu / spirtli içkilər; **2.** spirtlənmiş, spirtə qoyulmuş

**alcoholicity** [,ælkəhɔ'lısıtı] *n* alkoqolluq, spirtlilik

**alcoholism** ['ælkəhɔlızm] *n* alkoqolizm, keflilik, sərxoşluq, əyyaşlıq; **chronic** ~ xroniki sərxoşluq /əyyaşlıq

**alcoholize** ['ælkəhɔlaız] *v* **1.** *kim.* spirtə çevirmək; **2.** *kim.* spirtlə doydurulmaq, spirt hopdurulmaq; **3.** *tib.* spirtlə təmizləmək

**alcoholometer** [,ælkəhɔ'lɔmıtə] *n* spirtometr *(mayedə spirtin miqdarını göstərən cihaz)*

**alcoholometry** [,ælkəhɔ'lɔmıtrı] *n* spirtin tündlüyünün ölçülməsi

**Alcoran** [,ælkɔ'ra:n] *n* Quran

**alcove** ['ælkouv] *n* **1.** taxça; **2.** yataq yeri; arakəsmə *(otaqda)*; **3.** köşk, çardaq

**ale** [eıl] *n* pivə; **fresh** ~ təzə pivə; **strong** ~ tünd pivə *(alkoqolu yüksək olan)*; **bitter** ~ acı pivə; **to brew** ~ pivə bişirmək;

◊ **in the** ~ içmiş

**ale-barrel** ['eıl,bærl] *n* pivə çəlləyi

**ale-brewer** ['eıl,bru:ə] *n* pivəbişirən

**ale-house** ['eılhauz] *n* pivəxana, pivə içilən yer

**alert[1]** [ə'lə:t] *n* **1.** *hərb.* hərbi hazırlıq vəziyyəti; **2.** həyəcan, həyəcan siqnalı;

◊ **on the** ~ hazır, sayıq, ayıq, ayıq-sayıq; **to be on the** ~ hazır olmaq, ayıq-sayıq olmaq

**alert[2]** [ə'lə:t] *adj* **1.** sayıq, ayıq; ehtiyatlı, **extremely** ~ çox ehtiyatlı; ~ **to / for the opportunity** əlverişli/münasib fürsət gözləyən; **2.** diri, diribaş, çevik, zirək, qıvraq; **amazingly** ~ heyrətli / heyrətə səbəb ola biləcək qədər diribaş / zirək / çevik; **3.** tez anlayan / dərk edən, tez başa düşən, fərasətli, fəhmli, zəkalı; **mentally** ~ keskin zəkalı / fərasətli

**alert[3]** [ə'lə:t] *v* **1.** *hərb.* həyəcan elan etmək / qaldırmaq, həyəcanla ayağa qaldırmaq; **2.** təhlükə



haqqında əvvəlcədən xəbər vermək; **3.** hazır vəziyyətə gətirmək

**alertness** [ə'lə:tnıs] *n* **1.** sayıqlıq, ayıqlıq; ehtiyatlılıq; ehtiyat; **practical** ~ əməli sayıqlıq/ayıqlıq, gündəlik sayıqlıq / ayıqlıq; **2.** zirəklik, çeviklik; **mental** ~ əqli çeviklik / zirəklik; **3.** *hərb.* hərbi hazırlıq

**ale-tap** ['eıltæp] *n* pivə çəlləyinin kranı / lüləyi

**alethiology** [ə'li:θı'ɔlədʒı] *n* məntiqin həqiqət problemindən bəhs edən bölməsi

**ale-wife** [eılwaıf] *n (pl* **-wives** [-waıvz]) pivəxana sahibəsi

**alexia** [ə'leksıə] *n tib.* aleksiya *(oxumaq qabiliyyətini itirmə)*

**ale-yeast** ['eılji:st] *n* pivə mayası

**alga** ['ælgə] *n (pl.* **algae**) yosun

**algae** ['ældʒı:] *n* **alga** *sözünün cəm forması*

**algebra** ['ældʒıbrə] *n* cəbr

**algebraic** [,ældʒı'breıık] *adj* cəbr

**algebraical** [,ældʒı'breııkəl] *adj* = **algebraic**

**algebraist** [,ældʒı'breııst] *n* cəbr mütəxəssisi

**Algerian[1]** [æl'dʒıərıən] *n* əlcəzairli; **the ~s** *top. i* əlcəzairlilər

**Algerian[2]** [æl'dʒıərıən] *adj* əlcəzair; ~ **guest** əlcəzairli qonaq

**algetic** [æl'dʒetık] *adj tib.* **1.** xəstə, naxoş, azarlı, nasaz; **2.** ağrılı, ağrıyan; əziyyətli, iztirablı, əzablı

**algid** ['ældʒıd] *adj* soyuq, soyumuş

**algoid** ['ælgɔıd] *adj* yosunabənzər, yosunaoxşar, yosun kimi, yosunu xatırladan

**algologist** [æl'gɔlədʒıst] *n* yosunla məşğul olan mütəxəssis

**algology** [æl'gɔlədʒı] *n* alqologiya *(botanikanın yosunla məşğul olan bölməsi)*

**algorism** ['ælgərızm] *n* **1.** sayın ərəb sistemi; **2.** alqoritm

**algorithm** ['ælgərıðm] *n cəb.* alqoritm; ~ **of syntactic analysis** sintaktik analizin alqoritmi

**alias** ['eılıæs] *adv* başqa cür; ləqəbli; ayamalı; **John Smith, ~ the Baby** Con Smit, Beybi ləqəbi ilə tanınan/məşhur olan

**alibi[1]** ['ælıbaı] *n (pl* **alibis** ['æləbız] *hüq.* **1.** alibi *(cinayət zamanı müttəhimin cinayət yerində deyil, başqa yerdə olması; günahsızlıq)*; **dubious** ~ şübhəli alibi; **faked** ~ uydurulmuş alibi; **to prove an** ~ alibini sübut etmək; **to have** ~ əlində sübutu olmaq; **to establish** ~ alibi tapmaq/müəyyən etmək; **2.** *d.d.* bəraət, bəraət qazanma, haqq qazandırma, haqq qazanma, təmizə çıxma, təmizə çıxartma

**alibi[2]** ['ælıbaı] *v hüq.* **1.** sübut/alibi təqdim etmək /göstərmək, bəraət verilmək, təmizə çıxarılmaq; **2.** *d.d.* təmizə çıxmaq, bəraət qazanmaq

**alien[1]** ['eıljən] *n* **1.** əcnəbi, xarici, yabançı; **resident** ~ ölkədə yaşayan əcnəbi/ xarici; **to naturalize ~s** əcnəbilərə / xaricilərə vətəndaşlıq vermək; **to grant naturalization to an** ~ xariciyə / əcnəbiyə vətəndaşlıq almaq üçün icazə vermək; **2.** dönük adam, cəmiyyətdən qovulmuş adam; **3.** vətəndaşlıq imtiyazları şamil edilməyən adam

**alien[2]** ['eıljən] *adj* **1.** xarici, yadelli; əcnəbi; yad, özgə, yabançı; ~ **soil** yad/özgə torpaq; ~ **tongue** xarici/yabançı dil; ~ **word** xarici/özgə/yabançı/yad söz; **undeniablely/obviously** ~ inkaredilməz/şübhəsiz xarici/yadelli/yabançı; ~ **crops** *k.t.* xaricdən ölkəyə gətirilən bitkilər; ekzotlar *(bir yer üçün səciyyəvi olmayan, lakin həmin yerin iqliminə uyğunlaşdırılmış ağac və kol bitkiləri)*; **2.** xas/aid olmayan, yad; *Vanity is alien to his nature Şöhrətpərəstlik onun təbiətinə xas deyil / yaddır;* ~ **to the country** ölkəyə xas olmayan /yad olan; ~ **to my thoughts** mənim düşüncəmə xas olmayan; ~ **to his nature** onun təbiətinə aid/xas olmayan; **3.** bədxah, qeyri-səmimi, düşmən

**alienability** [,eıljənə'bılıtı] *n hüq.* özgəlik, uzaqlıq, soyuqluq*(münasibətdə, əlaqədə)*

**alienable** ['eıljənəbl] *adj hüq.* özgələşdirilən *(əmlak haq.)*

**alienage** ['eıljənıdʒ] *n hüq.* vəziyyət, vətəndaşlığı olmayan əcnəbinin statusu; **declaration of** ~ vətəndaşlığa qəbul etməkdən imtina etmək haqqında bəyannamə / bəyanat

**alienate** ['eıljəneıt] *v* **1.** ayırmaq, yadlaşdırmaq; soyuqlaşdırmaq, soyutmaq *(dostluğu, münasibəti və s.)*; **to be completely ~d** həmişəlik ayrılmaq/tamamilə soyumaq; **to be temporarily ~d** müvəqqəti ayrılmaq/soyumaq *(dostluqda, münasibətdə və s.)*, bir-birinə yad olmaq; **2.** *hüq.* müsadirə/zəbt etmək, almaq *(əmlakı, var-dövləti)*; **3.** *arx.* müəyyən edilmiş /nəzərdə tutulmuş yoldan sapdırmaq/azdırmaq / çıxartmaq

**alienation** [,eıljə'neıʃn] *n* **1.** özgələşdirmə, özgələşdirilmə *(mülkü, malı, dövləti)*; **2.** uzaqlaşma, soyuma, soyuqluq *(əlaqədə, dostluqda və s.)*; **3.** *hüq.* özgələşdirmə, alma, zəbt etmə *(mülkü)*; **4.** dəlilik, ruhi xəstəlik; psixoz

**alienism** ['eıljənızm] *n tib.* psixiatriya *(ruhi xəstəliklərdən və onların müalicə üsullarından bəhs edən elm)*

**alif** ['a:lıf] *n* əlif *(ərəb əlifbasının birinci hərfi)*

**aliform** ['eılıfɔ:m] *adj* qanadaoxşar, qanadabənzər

**alight[1]** [ə'laıt] *adj* **1.** yanan, yandırılmış, alova / oda bürünmüş; **to get** *smth.* ~ bir şeyi yandırmaq/ yaxmaq; bir şeyə od vurmaq; **to be** ~ yanmaq; *Lamps are alight Lampalar yanır;* **2.** parıldayan, parlayan, parlaq, şəfəqsaçan; ~ **faces** parlayan / şəfəqsaçan sifətlər; **faces ~ with happiness** xoşbəxtlikdən parlayan sifətlər

**alight[2]** [ə'laıt] *v* **1.** düşmək, enmək *(avtobusdan, tramvaydan və s.)*; **to ~ at the next stop** növbəti dayanacaqda düşmək / enmək; **to assist** *smb.* **to** ~ bir kəsə düşməyə / enməyə kömək

etmək *(avtobusdan, tramvaydan və s.); Don't alight from the moving train! Hərəkət edən / Getməkdə olan qatardan düşməyin /enməyin! All passengers for Stambul alight here! İstambula gedən sərnişinlər düşməyə hazırlaşsınlar!;* 2. oturmaq, qonmaq, enmək; *Birds alight on a tree Quşlar ağaca qonur;* **to ~ in a cornfield** çovdar zəmisinə qonmaq / enmək; **to ~ on the plain** düzənliyə oturmaq/enmək *(təyyarə haq.); Snow alights on a roof Qar dama düşür / yağır;* 3. düşmək; **to ~ on** ***one's*** **feet** ayaqları üstə düşmək *(atdanarkən, hoppanarkən);* 4. düşmək *(mehmanxanaya və s.),* qalmaq *(mehmanxanada və s.);* 5. təsadüfən aşkar etmək, aşkara çıxartmaq; təsadüf etmək; **to ~ upon a collection of manuscripts** təsadüfən əlyazmalar kolleksiyasını aşkar etmək / aşkara çıxarmaq

**alighting** [ə'laɪtɪŋ] *n* 1. qayıqdan düşürmə; 2. minik, minmə; 3. *av.* yerə enmə, yerə oturma *(təyyarə);* eniş, enmə

**align** [ə'laɪn] *v* 1. bir cərgəyə düzmək *(əsgəri və s.);* 2. bir cərgəyə düzülmək; *They aligned themselves with us Onlar bizimlə bir cərgəyə düzüldülər;* 3. nişan almaq; **to ~ the sights of a rifle and the mask** hədəfi nişan almaq, hədəfə götürmək; 4. *tex.* düzəltmək, qaydaya salmaq

**alignment** [ə'laɪnmənt] *n* 1. bir cərgədə dayanma/durma/yerləşmə; cərgəyə düzülmə; cərgəyə düzmə; 2. *tex.* düzəltmə, tarazlaşdırma, tarazlaşdırılma; 3. cərgənin düzlənməsi, cərgənin düzləndirilməsi; 4. qruplara bölmə / bölünmə; qruplaşdırma, qruplaşdırılma, qruplara ayırma / ayrılma; qrup, dəstə, blok; **a present ~ of forces in the world** dünyada qüvvələrin müasir qruplaşması; **restricted/closed military ~** məhdud / qapalı hərbi qruplaşma; 5. *hərb.* cərgənin xətti; 6. *tex.* quraşdırma, quraşdırılma; yerinə salma / geydirmə, kip taxma

**alike**[1] [ə'laɪk] *adj* 1. oxşar; **to be ~** oxşar olmaq; *They are very much alike Onlar çox oxşardırlar;* 2. eyni, eyni cür; **~ in value** qiymətdə eyni / eyni cür; **~ in beauty** gözəllikdə eyni; **~ in colour** eyni rəngdə; *All the children are alike Bütün uşaqlar eynidir / eyni cürdürlər*

**alike**[2] [ə'laɪk] *adv* eyni, eyni cür, oxşar; **to act ~** eyni /eyni cür hərəkət etmək; *They dress alike Onlar eyni/eyni cür geyinirlər; He treats all his children alike O bütün uşaqları ilə eyni cür rəftar edir*

**aliment**[1] ['ælɪmənt] *n* 1. yemək, yeyəcək, yeyinti, qida, yem; 2. *məc.* müdafiə etmə, tərəfdar olma, himayə etmə

**aliment**[2] ['ælɪmənt] *v* 1. saxlamaq; bəsləmək; 2. aliment vermək

**alimentary** [,ælɪ'mentərɪ] *adj* 1. yeyinti, qida; **~ canal** *anat.* qida borusu; 2. qidalı, bəsləyici; 3. *fiziol.* həzm; **~ system** həzm sistemi

**alimentation** [,ælɪmen'teɪʃn] *n* 1. yemə, qidalanma; qida, yeyəcək, yeyinti; yemləmə, yedirtmə; **forced ~** zorla yedirtmə; 2. *arx.* təmin etmə, saxlama, saxlanma

**alimentativeness** [,ælɪ'mentətɪvnɪs] *n* heyvanları yem axtarmağa məcbur edən instinkt

**alimony** ['ælɪmənɪ] *n* 1. saxlama, saxlanma; 2. aliment; **to entitle to ~** aliment alma hüququ vermək; **to sue for ~** aliment almaq üçün məhkəməyə vermək; 3. qida, yeyəcək, yeyinti, xörək

**alive**[1] [ə'laɪv] *adj* 1. diri, sağ; canlı; diribaş; **to be ~** sağ/diri olmaq, yaşamaq; **~ or dead** diri yaxud ölü; **a man ~** diri/ yaşayan adam; *He is the happiest man alive O yaşayan adamların ən xoşbəxtidir;* **no man ~** heç kim, heç kəs; **any man ~** hər bir adam, hər bir kəs, hamı; *It's a wonder I'm still alive Təəccüblüdür ki, mən hələ sağam/yaşayıram;* **to come ~** cana gəlmək, dirilmək; **to come ~ again** yenidən cana gəlmək; 2. mövcud/qüvvədə olan, fəaliyyət göstərən, yaşayan; **traditions ~** yaşayan ənənələr; **to keep** ***smth.*** **~** bir şeyi ölməyə qoymamaq/həyat səhnəsində saxlamaq; bir şeyə həyat vermək; **to keep fire ~** ocağı/odu sönməyə qoymamaq; **to keep discontent /hatred ~** narazılığı/nifrəti sönməyə / zəifləməyə qoymamaq; **to keep the attention of the audience ~** dinləyicilərin /tamaşaçıların diqqətini zəifləməyə qoymamaq; 3. diri, diribaş; çevik, gümrah, qıvraq; **very much ~** çox çevik / gümrah / diribaş; *Her eyes were wonderfully intelligent and alive Onun gözləri heyrət doğuracaq dərəcədə ağıllı və diri idi;* 4. dolu, bol; **river ~ with fish** balıqla dolu çay; 5. həssas, hiss edən, dərk edən, başa düşən; **~ to the danger** təhlükəni hiss edən; **~ to the beauty** gözəlliyi dərk edən/başa düşən; **to be ~ to a fact** hər hansı bir faktı aydınlığı ilə dərk etmək;

◊ **~ and kicking** sağ və salamat, gümrah; *Look alive! Tələs! Tərpən! Cəld ol/olun! Man alive!* 1) *Cəld ol/olun! Tez ol/olun!;* 2) *Lənətə gələsən! Lənət sənə! Lənət olsun!*

**alive**[2] [ə'laɪv] *adv* diri-diri, diri; **to burn ~** diri-diri yandırmaq; **to bury ~** diri-diri basdırmaq; **to bury** ***smb.*** **~** bir kəsi diri-diri basdırmaq; **to burn** ***smb.*** **~** bir kəsi diri-diri yandırmaq; *They buried the man alive Onlar kişini diri-diri basdırdılar*

**alizarin**[1] [ə'lɪzərɪn] *n kim.* alizarin *(boyayıcı maddə)*

**alizarin**[2] [ə'lɪzərɪn] *adj* alizarin; **~ colours** alizarin rəngi/boyası; **~ dye** alizarin piqmenti

**alkali**[1] ['ælkəlaɪ] *n (pl* **-lies** *[-laɪz]) kim.* qələvi

**alkali**[2] ['ælkəlaɪ] *adj* qələvi; qələvili; **~ disease** qələvi xəstəliyi *(heyvanlarda);* **~ soil** qələvili torpaq

**alkalimeter** [,ælkə'lɪmɪtə[r]] *n kim.* alkalimetr *(mayedə qələvinin miqdarını ölçən cihaz)*

**alkaline** ['ælkəlaɪn] *adj kim.* qələvili; **~ soil** qələvili torpaq



**alkalinity** [,ælkə'lɪnɪtɪ] *n kim.* qələvilik, qələvilik dərəcəsi

**alkalize** ['ælkəlaɪz] *v kim.* qələviləşdirmək

**alkalization** [,ælkəlaɪ'zeɪʃn] n kim. qələviləşmə; **~ of soil** torpağın qələviləşməsi / qələviləşdirilməsi

**alkaloid** ['ælkəlɔɪd] *n kim.* alkaloid *(bitkilərdən alınan azotlu maddələr, məs.: morfi, kinə və s.)*

**all**[1] [ɔ:l] *adj* 1. bütün, tam; **~ his life** onun bütün həyatı; *He lived here all his life O bütün həyatını burada yaşadı / yaşayıb;* **~ the time** bütün vaxtı; **~ (the) day** bütün gün(ü); *He worked hard all the day O bütün gün(ü) ciddi işlədi; I sat up all night Mən bütün gecəni oturdum/yatmadım;* **~ the year round** bütün il/ ili; **~ England / the country /the world** bütün İngiltərə/ölkə/dünya; **~ men** bütün adamlar; **~ things** bütün şeylər; **~ countries** bütün ölkələr; *All countries unite! Bütün ölkələr birləşin!* **at ~ times** bütün vaxtlarda, həmişə; **a poem suitable to ~ ages** bütün dövrlər / əsrlər üçün yarayan / məqbul olan poema; **a film suitable to ~ ages** həm yaşlıların, həm də uşaqların baxa biləcəyi film; 2. hər; hər cür, istənilən; **in ~ directions** bütün / hər istiqamətdə; **~ manner of ...** hər cür, hər növ; **~ manner of men / things** hər cür adamlar / şeylər; **in ~ respects** hər *(bir)* cəhətdən, hər *(bir)* baxımdan; **at ~ events** hər nə olur olsun, necə olur olsun, hər vəziyyətdə, heç nəyə baxmayaraq; **at ~ hours** istənilən saatda / vaxtda; 3. tam, ən çox, son, ən artıq; ən böyük; mümkün olan bütün, hər cür; **with ~ respect** tam / mümkün olan, hər cür hörmətlə, tam hörmətlə; **with ~ speed** ən axırıncı /son/ ən böyük sürətlə; *He spoke in all earnestness O, tam / son dərəcə səmimiyyətlə danışdı; I wish you all happiness Mən sənə / sizə hər cür xoşbəxtlik arzu edirəm;* 4. hansı olursa, nə olursa; biri, birisi, vur-tut, hər cür; **beyond ~ doubt** şübhəsiz, hər cür şübhədən kənar; *He denied all responsibility O bütün məsuliyyəti boynundan atdı; They denied all intention Onlar dedilər ki, onların heç bir niyyəti olmayıb; He was all ears O çox diqqətlə qulaq asırdı; I am all attention mən çox diqqətliyəm, Mən diqqətlə qulaq asıram; She was all smiles Onu təbəssüm çulğamışdı, Onun üz-gözündən təbəssüm yağırdı;*

◊ **~ thumbs** yöndəmsiz, küt, biçimsiz, əndazəsiz; *She is all thumbs Onun əlindən hər şey tökülür, O, kütdür / yöndəmsizdir; All things require skill but an appetite* at.söz. *İştahadan başqa hər şey bacarıq tələb edir / hər şeyə bacarıq lazımdır;* **All Fool's Day** ['ɔ:l'fu:lzdeɪ] 1 aprel *(zarafat günü)*

**all**[2] [ɔ:l] *pron* hamı, hamısı, hər şey; *All agree Hamı razıdır; All are present Hamı / Hamısı iştirak edir; We all want peace Biz hamımız sülh istəyirik; They all came Onların hamısı gəldi; All is lost Hər şey itdi / əldən çıxdı; They lost their all Onlar hər şeylərini itirdilər; That is all Vəssalam; Vəssalam, şüt tamam; I knew it all Mən onların hamısını bilirdim;* **~ in good time** hər şeyin öz vaxtı; **~ of them** onların hamısı; *All of them must work Onların hamısı işləməlidirlər; All of this is beside the point* amer. *Bunların hamısının məsələyə dəxli yoxdur;* **most of ~** hər şeydən çox; *I love him most of all Mən onu hamıdan çox sevirəm;* **best of ~** hər şeydən çox; **(the) best of ~ would be to...** 1) hər şeydən yaxşı olardı ki..; *The best of all would be to stay at home Hər şeydən yaxşı o olardı ki, sən / siz evdə qalaydın/qalaydınız;* 2) hamıdan çox; *I love her best of all Mən onu hamıdan çox / artıq sevirəm;* **one and ~, each and ~** bir nəfər kimi, bir nəfərə qədər; **one and ~** müstəsnasız /istisnasız olaraq hamı, bir nəfər kimi hamı, hamı bir nəfər kimi; **and ~** 1) bütün qalanlar da; *He bought the house and all O, evi də onun içində nə vardısa hamısını aldı;* 2) və ilaxirə, və sairə; *She washes, dusts and all O, yuyur, tozu alır və ilaxirə;* **~ in ~** 1) cəmi, ancaq, yalnız, nəticədə; *All in all, the article undergoes five inspections Nəticədə hər bir məmulat / mal/ məhsul beş dəfə yoxlanılır;* 2) ümumiyyətcə, bütövlükdə; *Take it all in all, this has been a hard week Ümumiyyətlə götürdükdə, bu həftə ağır olub; All in all, he is right Ümumiyyətlə / Bütövlükdə, o, haqlıdır; All in all, it might be worse Ümumiyyətlə, işlər pis də ola bilərdi;* 3) hər şeydən vacib, ən vacib; *My work was all in all to me İşim mənim üçün hər şeydən vacib idi/hər şey idi;* **at ~** 1) ümumiyyətlə; *If he comes at all Ümumiyyətlə o gəlsə;* 2) əgər bir az; *If he coughs at all, his mother runs to the doctor Əgər o bir az öskürsə, anası həkimə qaçır; If you hesitate at all... Əgər sən/siz bir az tərəddüd edirsənsə.../edirsinizsə...;* **not at ~** 1) əsla, qətiyyən, heç; **not at ~ good** əsla / qətiyyən / heç yaxşı deyil; **not at ~ clever** əsla /qətiyyən ağıllı deyil; **not at ~ stupid** heç də axmaq deyil; 2) buyurun, dəyməz *(sağ olun ifadəsinə cavab məqamında işlədilir);* **nothing at ~** 1) qətiyyən heç nə; 2) cəfəngiyyat, boş söz, boş şey, mənasız iş, çərən-pərən; **~ to the good** hər şey yaxşılığa doğru;

◊ **~ for nothing** nahaq, nahaq/əbəs yerə, bihudə, hədər, boş/hədər yerə

**all**[3] [ɔ:l] *adv* bütün, təmiz, tamam, tamamilə, bütövlükdə, büsbütün; *The spoon is all gold Qaşıq bütün / təmiz / büsbütün / bütövlükdə qızıldır; All was covered with mud Hər şey bütövlükdə/büsbütün palçıqla örtülü idi; That's all wrong Bu, qətiyyən belə deyil; Things are all wrong Hər şey tərsinə gedir; I'm all for staying at home Mən bütövlükdə evdə qalmağın tərəfdarıyam; He lived all alone O tamamilə/tamam*

*tək yaşadı; He did it all alone O bunu tamamilə tək etdi;* ~ **along** *d.d.* həmişə, hər zaman, hər vaxt; *I knew it all along Mən onu həmişə bilirdim, O mənə çoxdan məlum idi;* ~ **round and ~ around** hər tərəfdən, hər yandan; ~ **through** axıra kimi/qədər, tamamilə; **to read a book ~ through** kitabı əvvəldən axıra qədər / kimi oxumaq; ~ **at once** qəflətən, birdən, gözlənilmədən; *He came all at once O qəflətən / gözlənilmədən gəldi; They changed their decision all at once Onlar qərarlarını gözlənilmədən dəyişdilər;* ~ **of a sudden** birdən, birdən-birə; qəfildən, qəflətən; *They left the city all of a sudden Onlar şəhəri qəflətən / birdən tərk etdilər;* ~ **but** az qala, demək olar ki; *I all but fell Mən az qala yıxılmışdım; It's all but impossible Bu demək olar ki, mümkün deyil; He all but drowned O az qala batmışdı;* ~ **the same 1)** fərqi yoxdur, birdir, eyib etməz; *It is all the same to me Mənim üçün fərqi yoxdur / birdir; If it is all the same to you Əgər sənin/sizin üçün fərqi yoxdursa, Əgər sən/siz etiraz etməsən/etməsəniz...;* 2) hər halda, buna baxmayaraq, yenə də, bununla belə; *All the same I wish you hadn't done it Bununla belə mən istərdim ki, sən / siz bunu etməmiş olaydın / olaydınız;*
◊ *He is not quite all there Onun ağlı başında deyil, Onun başı çatmır*

**all-** [ɔ:l] *pref mürəkkəb sözlərin tərkib hissəsi:* **1)** ancaq, teyxa; **~girl team** ancaq qızlardan ibarət komanda / taqım; **~wool dress** teyxa yun parçadan tikilmiş paltar; 2) ümumi; **~city meeting** ümumşəhər mitinqi/toplantısı; **~British election** ümumbritaniya seçkisi

**all-around**[1] ['ɔ:lə'raund] *n id.* çoxnövlülük üzrə yarış

**all-around**[2] ['ɔ:lə'raund] *adj* = **all-round**

**Allah** ['ælə] *n* Allah (c.c)

**allay** [ə'leı] *v* I zəiflətmək, yüngülləşdirmək, azaltmaq, sakitləşdirmək *(ağrını, qorxunu və s.);* **to ~ pain** ağrını yüngülləşdirmək /zəiflətmək / azaltmaq; **to ~ excitement** həyəcanı yüngülləşdirmək / zəiflətmək; **to ~ trouble** həyəcanı toxtatmaq / yüngülləşdirmək; **to ~ thirst** susuzluğu yatırtmaq /kəsmək /söndürmək

**allay** [ə'leı] *v* II **1.** qatışdırmaq, qatmaq; *(xüs. metalı paslanan metalla: qızılı misla və s.);* **2.** qarışdırmaq, qatmaq

**all-clear** ['ɔ:klıə<sup>r</sup>] *n* "təhlükə bitdi/sovuşdu" *(siqnal)*

**all-crop drill** ['ɔ:lkrɔp'drıl] *k.t.* universal səpin maşını, universal toxumsəpən *(maşın)*

**all-day** [.ɔ:l'deı] *adj* bütün gün davam edən; **an ~ event** bütün gün davam edən hadisə

**allegation** [.ælə'geıʃn] *n* **1.** təsdiq, təsdiqləmə, təsdiq etmə *(səs verma ilə);* **unsupported ~** fakta əsaslanmanı təsdiqləmə; **2.** fikir, müddəa *(əsası olmayan);* **to prove an ~** fikri / müddəanı təsdiq etmək; **to refute an ~** fikri / müddəanı təkzib etmək; **3.** *hüq.* iddia; **~ of faculties** arvadın ərinin maddi vəziyyəti haqqında bəyanatı *(aliment almaq üçün arvadın təqdim etdiyi iddia)*

**allege** [ə'ledʒ] *v* **1.** təsdiq etmək; əsaslandırmaq, məlumat vermək *(əsas, dəlil gətirmədən); They are alleged to have signed a secret treaty but they have given no proof Məlumat verirlər ki, onlar guya gizli müqavilə imzalayıblar, lakin heç bir dəlil göstərmirlər;* **to ~ repeatedly** dəfələrlə təsdiq etmək; **to ~ insistently** qətiyyətlə təsdiq etmək; **to ~ *smth.* as a fact** bir şeyi fakt /dəlil kimi təsdiq etmək; **2.** bəraət qazandırmaq *(bir şeylə);* əsaslanmaq *(bir şeyə);* **to ~ illness** xəstəliklə əsaslandırmaq, xəstəliyə əsaslanaraq *(bir şeyə)* haqq qazandırmaq; **to ~ *smth.* as a reason for not doing the work** bir işi görməməyin səbəbini nə iləsə əsaslandırmaq; **3.** *arx.* and içməklə bir şey haqqında məlumat vermək *(məhkəmədə);* **4.** *arx.* iqtibas / sitat gətirmək; **to ~ for *smth.*** bir şeyə dair sitat / iqtibas gətirmək; **to ~ against *smth.*** bir şeyin əleyhinə iqtibas / sitat gətirmək

**alleged** [ə'ledʒd] *adj* əsassız, əsası olmayan; saxta, uydurma, yalançı, yalan, xəyali; **the ~ refusal** əsli olmayan/əsassız imtina; **the ~ acceptance** əsassız/əsli olmayan razılıq; **the ~ conference/meeting** guya olmuş/ keçirilmiş konfrans / iclas; **the ~ murderer** qətldə ittiham olunan şəxs, güman edilən qatil

**allegedly** [ə'ledʒıdlı] *adv* təsdiq edildiyinə görə *(əsassız olaraq),* guya, sanki, **~ difficult / impossible / succesful** guya, çətin/qeyri-mümkün; *She allegedly lost consciousness Guya, o, huşunu itirmişdi*

**allegiance** [ə'li:dʒəns] *n* **1.** sədaqət, vəfa, etibar; loyallıq *(adət. dövlətə, hökumətə və s.);* **firm ~** möhkəm sədaqət / loyallıq; **unflinching ~** sarsılmaz sədaqət/loyallıq; **absolute ~** mütləq sədaqət/loyallıq; **to pledge ~** sədaqətli olmaq haqqında and içmək; **to declare ~** öz sədaqətini elan etmək; **to swear ~** sədaqətli olmaq haqqında and içmək; **to abandon/to renounce / to repudiate ~** sədaqətə xəyanət etmək; **2.** *tar.* vassal asılılığı; **to free from ~** vassal asılılığından azad etmək

**allegiancy** [ə'li:dʒənsı] *n* = **allegiance**

**allegoric** [.æle'gɔrık] *adj* alleqorik, kinayəli; **~ story/poem** alleqorik hekayə/ poema

**allegorical** [.æle'gɔrıkəl] *adj* **allegoric**

**allegorically** [.æle'gɔrıkəlı] *adv* kinayə ilə, eyhamla, alleqorik bir tərzdə; **to speak ~** kinayə ilə / eyhamla danışmaq

**allegorist** ['ælıgərıst] *n* **1.** alleqorist, alleqorik əsər yazan; 2. eyhamla danışan

**allegory** ['ælıgərı] *n* alleqoriya *(1) mücərrəd məfhumların konkret obrazlarda ifadəsi; 2) kinayə);* **apt / hidden ~** uğurlu /gizlin alleqoriya; **philosophical ~** fəlsəfi alleqoriya



**allegretto** [.ælı'gretou] *n mus.* alleqretto *(1) orta tezlikdə musiqi tempi; 2) çox iti çalınmayan musiqi əsəri)*

**allegro** [ə'leıgrou] *n mus.* alleqro *(1) cəld/ tez çalmaq lazım gəldiyini göstərən musiqi termini; 2) tez çalınan musiqi əsəri)*

**allergic** [ə'lə:dʒık] *adj* allergiya; **to be ~ to *smth.*** bir şeydən allergiya tutmaq; *He is allergic to draughts O, yelçəkəndən/ skvaznyakdan allergiya tutur / olur*

**allergy** ['ælədʒı] *n tib.* allergiya

**alley** ['ælı] *n* **1.** alleya, xiyaban; **shady ~** kölgəli alleya/xiyaban; **secluded ~** tənha xiyaban/alleya; **lonely ~** adamsız / adam olmayan xiyaban/alleya; **2.** dar küçə, dalan *(şəhərin ucqar yerlərində);* **filthy ~** çirkli dalan; **twisting ~** əyri dalan; 3. keqelhan *(1) keqel oynamaq üçün xüsusi yer; 2) keqel düzmək və şarları diyirlətmək üçün meydança)*

**alliance**[1] [ə'laıəns] *n* **1.** ittifaq *(adətən dövlətlər arasında);* alians; **defensive ~** müdafiə ittifaqı / aliansı; **military ~** hərbi ittifaq/alians; **an ~ between states** dövlətlər arasında ittifaq / alians; **to make / to form an ~** ittifaq / alians təşkil etmək, ittifaq / alians yaratmaq; **to terminate /to dissolve / to revoke an ~** ittifaqı / aliansı dağıtmaq, ittifaqdan çıxmaq; **to be in ~ with *smb.*** bir kəslə ittifaqa daxil olmaq; **to unite in ~** ittifaqda birləşmək; **2.** kəbin; **matrimonial/nuptial ~** kəbin; **unhappy ~** uğursuz kəbin; **long desired ~** səbirsizliklə gözlənilən kəbin, çoxdan gözlənilən kəbin; **3.** birləşmə; *(təşkilatların, partiyaların və s.);* **political ~** siyasi birləşmə; **tribal ~** qəbilə birləşməsi

**alliance**[2] [ə'laıəns] *v* ittifaqa daxil olmaq, birləşmək

**allied** ['ælaıd, ə'laıd] *adj* **1.** siyasi razılaşma ilə birləşmiş; **2.** müttəfiq, əlaqəli; qohum, yaxın; **painting and other ~ arts** rəssamlıq və digər qohum incəsənət növləri; **the A. powers** müttəfiq dövlətlər; **A. Air Force** birləşmiş hərbi hava qüvvələri *(ingilis-Amerika);* **3. ~ sciences** qohum elmlər; **~ subjects** yaxın/qohum fənlər

**alligator** ['ælıgeıtə<sup>r</sup>] *n* **1.** *zool.* alliqator *(Amerika timsahı);* **2.** *tex.* daşdoğrayan maşın; **3.** avtomobil-amfibiya

**all-important** ['ɔ:lım'pɔ:tənt] *adj* ümumi əhəmiyyət kəsb edən, çox vacib, çox önəmli

**all-in** ['ɔ:l'ın] *adj d.d.* **1.** əldən düşmüş, haldan düşmüş; çox yorğun/üzgün/tabsız; *I am all-in Mən lap əldən/haldan düşmüşəm, Mən çox yorğunam;* **2.** hər cür fəndi işlətməyi mümkün hesab edən *(güləşdə);* **3.** hər şeylə birlikdə; *I'll sell you the car, tyres, and radio at an all-in price Mən sənə / sizə maşınla birlikdə, şinləri, radionu və digər şeyləri də satacam*

**alliteration** [ə.lıtə'reıʃn] *n* alliterasiya *(eyni bir səsin və ya səslərin 2 və ya daha çox bir-birinə qonşu yaxud yaxın sözlərdə işlənməsi:* **Round the rocks runs the river** *cümləsində olduğu kimi. Bu cümlədə [r] səsi 4 dəfə təkrar olunur. Buna alliterasiya deyilir)*

**all-knowing** ['ɔ:l'nouıŋ] *adj* hər şeyi bilən, hər şeydən xəbəri olan, hər şeydən xəbərdar olan

**all-might** ['ɔ:l'maıt] *n şair.* hər şeyə qadirlik

**allness** ['ɔ:lnıs] *n* ümumilik, universallıq

**all-night** ['ɔ:l'naıt] *adj* **1.** bütün gecə davam edən; **an ~ game of cards** bütün gecə davam edən qumar oyunu; **2.** bütün gecə açıq olan; **an ~ shop** bütün gecə açıqolan mağaza

**allocate**[1] ['æləkeıt] *n arx.* pul buraxma; dotasiya *(xərclərini ödəmək üçün müəssisələrə dövlət tərəfindən verilən pul)*

**allocate**[2] ['æləkeıt] *v* **1.** bölüşdürüb pay olaraq vermək; *We must allocate the money carefully Biz pulu diqqətlə bölüşdürməliyik;* **2.** pul ayırmaq, pul buraxmaq, pul təxsis etmək

**allocation** [.ælə'keıʃn] *n* **1.** pul buraxma; təxsisat, ayrılmış məbləğ; **2.** lokallaşdırma; yayılmağa qoymama, məhdudlaşdırma *(yanğını, müharibəni və s.),* yerini müəyyənləşdirmə

**allograph** ['æləgra:f] *n* alloqraf *(başqa şəxsin əvəzinə çəkilmiş qol/qoyulmuş imza)*

**allopath** ['æloupæθ] *n tib.* allopat *(allopatiya tərəfdarı olan həkim: bax* **allopathist**

**allopathic** ['æloupæθık] *adj kim.* allopatik

**allopathist** [ə'lɔpətıst] *n* = **allopath**

**allopathy** [ə'lɔpəθı] *n tib.* allopatiya

**allot** [ə'lɔt] *v (-tt-)***1.** irəlicədən/qabaqcadan təyin etmək, təxsis etmək, ayırmaq; müəyyən etmək; **2.** tapşırmaq; *Our class was allotted the garden Bizim sinfə bağda işləmək tapşırılmışdır; What is allotted to you? Sənə/Sizə nə tapşırılmışdır? Each speaker is allotted five minutes Hər bir natiqə beş dəqiqə ayrılmışdır;* **to ~ credits** kredit vermək / ayırmaq; **to ~ a task** tapşırıq vermək; **3.** bölüşdürmək, bölmək, təqsim etmək, paylamaq; **to ~ profits** gəliri bölüşdürmək; **to ~ fairly** ədalətlə bölüşdürmək; **to ~ unjustly** ədalətsiz bölüşdürmək; **to ~ impartially** insafla / qərəzsiz olaraq bölüşdürmək; **3.** *amer. d.d.* hesab etmək, güman etmək; **4.** tərkibə daxil etmək

**allotment** [ə'lɔtmənt] *n* **1.** bölmə, bölgü, təqsim; bölüşdürmə, bölünmə, təqsim etmə; paylama, paylanma; paylaşdırma; paylaşdırılma; təyin etmə, təyin edilmə; **2.** arendaya verilmiş sahə; **3.** payçıya aksiya ayrılması; **4.** *hərb.* tərkibə daxil edilmə / olunma; əlavə etmə / edilmə, üstəlik vermə / verilmə

**all-out** ['ɔ:l'aut] *adj d.d.* **1.** = **all-in**; **2.** çox ağır, üzücü, əldən salan, gərgin; **~ attack** *hərb.* bütün gücü ilə hücum; **3.** ümumi, total; **~ warfare** ümumi / total müharibə; **4.** ən sürətli, son dərəcə sürətli

**all-outer** ['ɔ:l'autə<sup>r</sup>] *n amer. d.d.* qəti tədbir tərəfdarı, qətiyyətli adam, cəsarətlə / qətiyyətlə / qorxmadan hərəkət edən adam

**all-over** [ˌɔ:l'ouvəʳ] *adv* **1.** *d.d.* bütün örtülmüş, örtülmüş; *His hands are all over scratches Onun əlləri cızıqla örtülmüşdür; Onun əlləri tamam cızıq-cızıqdır/çırmaq-çırmaqdır;* **2.** *d.d.* hər yerə, hər yerdə, hər tərəfə, hər tərəfdə; ~ **the room** otağın hər yerində; ~ **the country** ölkənin hər tərəfində / hər yerində; ~ **the world** dünyanın hər yerində / hər tərəfində, bütün dünyada; *He looked all over for the lost book O, itmiş kitab üçün hər yerə baxdı;* **3.** son verilmə, sona çatma; **to be** ~ sona çatmaq / tamam qurtarmaq; *Their troubles are all over Onların bütün əzabları / ağrıları qurtardı / sona çatdı;* **4.** *Mənanı güvvətləndirmək üçün işlədilir:* tam, tamam, lap; *She is her mother all over O, tamamilə/lap anasıdır / anasına oxşayır*

**all-overish** ['ɔ:l'ouvərɪʃ] *adj d.d.* özünü xəstə hiss edən/pis hiss edən, kefsiz, əzgin, süst, nasaz; *I feel all-overish Mən özümü xəstə hiss edirəm, Mən nasazam /kefsizəm /süstəm /əzginəm*

**allow** [ə'lau] *v* **1.** icazə / izin vermək; **to** ~ ***smb.* to do *smth.*** bir kəsə bir iş görmək üçün icazə / izin vermək; **to** ~ **oneself to do *smth.*** özünə bir işi görməyi rəva bilmək; *Smoking is not allowed here Burada papiros / siqaret çəkməyə icazə / izin verilmir; Shooting is allowed here Burada ov etməyə icazə/izin verilir; Will you allow me to use your pen? Qələmindən/Qələminizdən istifadə etməyə mənə icazə verərsənmi/verərsinizmi? Allow me İcazə ver/verin (bir kəsə xidmət göstərmək məqamında işlənir); She allowed herself no sweets O çalışdı ki, konfet yeməsin, o özünü şirniyyatdan məhrum etdi;* **2.** imkan yaratmaq/vermək; *This gate allows access to the garden Bu darvaza bağa girməyə imkan verir; Bu darvazadan bağa girmək olar /mümkündür;* **3.** vermək *(adət. pul, para)*, təqdim etmək; **to** ~ **regularly** ardıcıl /müntəzəm olaraq vermək/ödəmək *(pul və s.)*; **to** ~ **lavishly** bolluca/çoxlu/əlini qısmadan ödəmək /vermək; **to** ~ ***smb.* spending money** xırda xərclər üçün bir kəsə pul/para vermək, bir kəsə cibxərcliyi vermək; *How much money does your father allow you for books? Kitab almaq üçün atan / atanız sənə / sizə nə qədər pul verir? They allow me one day a week Onlar mənə həftədə bir istirahət günü verirlər;* **4.** etiraf etmək, qəbul etmək; razılaşmaq; **to** ~ **a claim/ an argument** tələbi /arqumenti qəbul etmək; *One must allow his cleverness / that he is clever Onun ağıllı olmasını hamı etiraf etməlidir;* **5.** güzəştə getmək, güzəşt etmək; **to** ~ **a shilling in the pound** hər bir funtda bir şillinq güzəştə getmək/ güzəşt etmək; **6.** *arx.* tərifləmək, tərif etmək; mədh etmək; bəyənmək; **to** ~ **for** əvvəlcədən nəzərə almaq, nəzərdə tutmaq, hesaba almaq; **to** ~ **for other expenses** başqa xərcləri əvvəlcədən nəzərə almaq; **to** ~ **of** yol vermək; ehtimal etmək, güman etmək, mümkün hesab etmək; *The matter allows of no delay Məsələni təxirə salmağa yol vermək olmaz*

**allowable** [ə'lauəbl] *adj* yol / icazə verilə bilən, mümkün olan, caiz, qəbul oluna bilən, münasib; qanuni, qanunauyğun; ~ **to *smb.*** bir kəs üçün qəbul oluna bilən/ münasib; ~ **to sale** satış üçün qanuni / münasib

**allowably** [ə'lauəblı] *adv* qəbul oluna biləcək bir tərzdə / vəziyyətdə, münasib bir tərzdə

**allowance**[1] [ə'lauəns] *n* **1.** nəzərə/hesaba alınma; düzəliş, əlavə düzəliş, təshih; təmizə çıxartma, bəraət qazandırma, haqlı çıxartma, bəraət; **to make** ~ nəzərə / hesaba almaq *(bir şeyi)*; bəraət qazandırmaq *(bir şeydə)*; **to make** ~ **for *smb.'s* illness** bir kəsin xəstəliyini nəzərə/hesaba almaq; **to make** ~ **for *smb.'s* youth/inexperience** bir kəsin cavanlığını/təcrübəsizliyini nəzərə /hesaba almaq; **to make every** ~ bütün vəziyyəti/hər bir vəziyyəti nəzərə almaq; **to make** ~ **for future developments** hadisələrin gələcək inkişafını nəzərə almaq; **2.** güzəşt; **to make** ~ **for waste** zay olan mal üçün güzəşt etmək, zay olma ehtimalını nəzərə almaq; **3.** pul müavinəti, pul yardımı; cib xərcliyi; **dress** ~ paltar almaq üçün pul; **liberal** ~ səxavətli / bol pul yardımı; **regular** ~ müntəzəm pul yardımı; **irregular** ~ qeyri-müntəzəm pul yardımı; **to continue** ~ müəyyən miqdar pul yardımı verməyi davam etdirmək; **4.** pay, porsiya, ərzaq payı; yem miqdarı; ~ **of food** ərzaqvermə payı; **water/bread** ~ su/çörək payı; **to put on short** ~ məhdudlaşdırılmış pay vermək; payı kəsmək /azaltmaq; ~ **of ammunition** *hərb.* **1)** döyüş komplekti *(döyüş aparmaq üçün lazım olan hərbi sursat)*; **2)** *hərb.* müxtəlif cür təminat *(azuqə, pal-paltar)*; **5.** *arx.* bəyənmə, icazə; **6.** *id.* handikap *(idman oyunlarında zəif oyunçulara verilən güzəşt)*, fora *(oyunda güvvətli oyunçunun zəif oyunçuya qabaqcadan verdiyi güzəşt)*

**allowance**[2] [ə'lauəns] *v* **1.** istifadəni azaltmaq; **2.** pay təyin etmək; məhdud miqdarda vermək

**alloy**[1] ['ælɔı] *n* **1.** ərinti, xəlitə; **2.** qatışıq; **3.** əyar *(qiymətli metallarda)*

**alloy**[2] ['ælɔı] *v* **1.** əritmək *(metalı)*; **2.** aşqar qatmaq *(metala)*; **3.** *məc.* **1)** korlamaq, xarab etmək; pozmaq, pisləşdirmək; **2)** kədərləndirmək, ovqatını təlx etmək, pərt etmək, qan qaraltmaq

**all-powerful** ['ɔ:l'pauəfl] *adj* hər şeyə qadir, hər şeyi edə bilən / bacaran

**all-purpose** [ˌɔ:l'pə:pəs] *adj* universal; geniş işlədilən; ~ **tractor** universal traktor; ~ **cleaning liquid** universal yuyucu maye *(yəni çox sahələrdə istifadə edilə bilən)*

**all-right**[1] ['ɔ:l'raıt] *adj* **1.** kafi, kifayət qədər, kifayətləndirici, qənaətbəxş, qənaətləndirici; lazımi qədər; **2.** müvafiq, uyğun gələn, münasib, əlverişli; **3.** yaxşı, sağlam; *She was ill but she is all-right again O, xəstə idi, lakin indi yenə də yaxşıdır*



**allright**[2] ['ɔ:l'raıt] *adv* kafi, münasib, necə lazımdır; qaydasında; *His work is all-right Onun işləri yaxşıdır / qaydasındadır; All right! Let us go Yaxşı! Gedək.*

**all-round** ['ɔ:l'raund] *adj d.d.* **1.** hərtərəfli, çoxtərəfli, müxtəliftərəfli; ~ **man** hərtərəfli/məlumatlı adam; ~ **sportsman** çoxtərəfli idmançı; **2.** *id.* mütləq; ~ **champion** mütləq çempion; **3.** dairəvi; ~ **defence** *hərb.* dairəvi müdafiə

**all-rounder** [ˌɔ:l'raundəʳ] *n d.d.* **1.** yaxalıq, yaxa; **2.** xalta, boyunluq; **3.** *id.* onnövçü

**All-Russian** ['ɔ:l'rʌʃn] *adj* Ümumrusiya; ~ **conference** Ümumrusiya konfransı

**all-star** ['ɔ:lsta:ʳ] *adj teatr. kin.* ancaq ulduzlardan ibarət olan *(truppa-artistlər dəstəsi haq.)*; **special** ~ **matinee** bütün rolların ulduzların ifa etdiyi gündüz tamaşası

**all-time** ['ɔ:ltaım] *adj* görünməmiş, misilsiz, tayı-bərabəri olmayan, son dərəcə, olmazın dərəcədə; ~ **record** misilsiz /tayı-bərabəri olmayan rekord; ~ **high** görünməmiş yüksək, olmazın dərəcədə yüksək; ~ **low** olmazın dərəcədə /son dərəcə alçaq *(qiymətin səviyyəsi və s. haq.)*

**allude** [ə'lu:d] *v* **1.** isnad etmək, əsaslanmaq, istinad/müraciət etmək; qeyd etmək, xatırlatmaq, adını çəkmək, anmaq; **to** ~ **to recent facts** son hadisələrə / faktlara əsaslanmaq/istinad etmək /isnad etmək, son hadisələri/faktları yada salmaq/xatırlatmaq; **to** ~ **to a situation** vəziyyətə əsaslanmaq / isnad etmək/ istinad etmək / xatırlatmaq; **to** ~ **to *smb.*** bir kəsə isnad/istinad etmək/əsaslanmaq; *Don't allude to this question Bu məsələyə toxunma/toxunmayın;* **2.** nəzərdə tutmaq, eyham vurmaq, işarə etmək; kinayə etmək, söz atmaq; *He didn't mention your name but I'm sure he was alluding to you O sənin/sizin adını/adınızı çəkmədi, lakin mən əminəm ki, o səni / sizi nəzərdə tuturdu*

**all-Union** ['ɔ:l'ju:njən] *adj* ümumittifaq; ~ **election** ümumittifaq seçkisi

**allure** [ə'ljuəʳ] *v* **1.** şirnikdirmək; **2.** yoldan /başdan çıxarmaq, azdırmaq, tamahsılandırmaq; **to be ~d by *smb.*** bir kəs tərəfindən yoldan / başdan çıxarılmaq; **to be ~d into doing *smth.*** bir işi görməyə tamahsılandırılmaq, bir işə cəlb olunmaq; **3.** heyran / məftun etmək; **to be ~d to music** musiqiyə heyran / məftun olmaq; **to be ~d to learning** elmə həvəs göstərmək; **4.** *arx.* cəlb /cəzb etmək

**allurement** [ə'ljuəmənt] *n* **1.** cazibə, şirnikdirici şey, başdan çıxaran şey; azma, yoldan çıxma; cəzbedici qüvvə; **~s of the big city** böyük şəhərin cazibələri / aldadıcı əlamətləri; **2.** cazibə, cazibədarlıq, məlahət, füsunkarlıq; gözəllik; **3.** *arx.* şirnikdirmə, yoldan çıxarma, azdırma, məftun etmə, tamaha salma; yoldan çıxma, azma, aldanma

**alluring** [ə'ljuərıŋ] *adj* **1.** şirnikdirici, tamahsılandırıcı; aldadıcı, yoldan/başdan çıxaran; cazibəli, cəzbedici, ehtiras oyadan; ~ **proposal** cəzbedici/şirnikdirici təklif; **2.** heyranedici, məftunedici, cazibədar, füsunkar; çox gözəl /qəşəng, könülaçan

**alluringly** [ə'ljuərıŋlı] *adv* **1.** cəlbedici *(bir)* tərzdə; **2.** məftunedici tərzdə, məftunluqla

**allusion** [ə'lu:ʒn] *n* **1.** əsaslanma, istinad etmə; sitat gətirmə; sitat, dəlil; **2.** yada salma, xatırlama, anma, anılma; **to make an** ~ **to** əsaslanmaq; **3.** eyham; *His poetry is full of classical allusions Onun poeziyası klassik eyhamlarla doludur;* **crude** ~ kobud eyham; **casual** ~ təsadüfi eyham

**allusive** [ə'lu:sıv] *adj* **1.** sitatla / dəlillə dolu; **2.** eyhamlı, tərkibində eyham olan

**allusively** [ə'lu:sıvlı] *adv* **1.** eyhamla, eyham işlətməklə; **2.** kinayə ilə; **to speak** ~ eyhamla / kinayə ilə danışmaq

**alluvial** [ə'lu:vjəl] *adj geol.* gətirilmiş, yaranmış, yaradılmış *(küləklə, su ilə və s.)*; ~ **soil** su ilə gətirilmiş/su gətirmiş torpaq; **an** ~ **plain** sel sularından yaranmış düzənlik

**all-work** ['ɔ:lwə:k] *n* hər cür ev işi ilə məşğul olan *(adam)*; **maid of** ~ hər cür ev işi görən qarabaş / ev qulluqçusu

**ally**[1] ['ælaı] *n* **1.** müttəfiq; **faithful** ~ sadiq müttəfiq; **loyal** ~ etibarlı / mötəbər / bel bağlanıla bilən/möhkəm müttəfiq; **tested** ~ sınanmış-/yoxlanılmış/sınaqdan keçirilmiş müttəfiq; ~ **of the moment** müvəqqəti/təsadüfi müttəfiq; **2.** köməkçi; xidmətçi, əməkdaş

**ally**[2] [ə'laı] *v* *(pt, pp* **-ied***)* **1.** ittifaqa daxil olmaq, birləşmək *(müqavilə vasitəsilə)*; **2.** **(with, to)** ittifaqda birləşmək *(ölkələr haq.)*; **to** ~ ***(oneself)* with / to** müqavilə ilə /kəbinlə birləşdirmək/birləşmək; *Britain was allied with the United States in both World Wars Britaniya hər iki dünya müharibəsində ABŞ ilə birləşmişdir/müttəfiq idi;* **to be allied to** qohum olmaq; *The English language is allied to the German language İngilis dili alman dilinə / dili ilə qohumdur*

**almight** [ɔ:l'maıt] *adj d.d.* = **almighty**

**almighty** [ɔ:l'maıtı] *adj* **1.** qadir, hər şeyə qadir, qüdrətli; hökmran; **Almighty God, the Almighty** qadir/hər şeyə qadir/qüdrətli Allah; **the** ~ **dollar** hər şeyə qadir / qüdrətli dollar; **2.** dəhşətli, müdhiş; şiddətli, faciəli; ~ **nonsense** dəhşətli/müdhiş cəfəngiyyat / uydurma; ~ **cold** dəhşətli / şiddətli soyuq

**almond**[1] ['a:mənd] *n* **1.** *bot.* badam; **2.** *anat.* badamabənzər, badamcıq vəzisi; **3.** badam içi / ləpəsi

**almond**[2] ['a:mənd] *adj* **1.** badam; ~ **taste** badam dadı; ~ **blossom** badam çiçəyi; ~ **tree** badam ağacı; **2.** badamı; ~ **eyes** badamı gözlər

**almond-butter** ['a:mənd.bʌtəʳ] *n* badam yağı

**almond-eyed** ['a:mənd'aıd] *adj* badamgözlü; ~ **woman/girl** badamgözlü qadın/qız

**almond-milk** ['a:mənd'mılk] *n* badam südü

**almond-oil** ['a:mənd'ɔıl] *n* badam yağı

**almondy** ['a:məndı] *adj* badamı, badama bənzər /oxşar

**almoner** ['a:mənər] *n* **1.** sədəqə paylayan *(saray-da və ya dini təşkilatlarda vəzifə)*; **2.** xəstələrə müalicə üçün və məişət xidməti üçün xərc verən vəzifəli şəxs *(xəstəxanada)*

**almonry** ['a:mənrı] *n tar.* sədəqə verilən yer

**almost** ['ɔ:lmoust] *adv* demək olar ki, az qala; təxminən, təqribən; ~ **always** demək olar ki, həmişə; ~ **never** demək olar ki, heç vaxt; *Almost finished Demək olar ki, qurtarıb; I almost missed the plane Mən az qala təyyarəyə gecikmişdim; She almost dropped the plate O az qala boşqabı salmışdı; She said almost nothing Demək olar ki, o heç nə demədi;* ~ **everybody** demək olar ki, hamı

**alms** [a:mz] *n (cəmdə dəyişmir)* **1.** sədəqə *(kasıblara verilən pul, ərzaq, paltar və s.)*; **to ask/to beg** ~ sədəqə istəmək/yığmaq; **to give** ~ sədəqə vermək; **to donate** ~ ianə verməklə kömək etmək; fəda etmək; **to support** *smb.* **by** ~ bir kəsə ianə verməklə kömək etmək; **2.** *arx.* savab iş, savab; xeyriyyəçilik; mərhəmət, rəhm, şəfqət; **3.** *hüq.* xeyriyyəçilik əsasında sahib olma / əldə etmə

**alms-basket** ['a:mz.ba:skıt] *n* nəzir-niyaz qutusu; ◊ **to live on the** ~ nəzir/sədəqə ilə yaşamaq

**alms-folk** ['a:mzfouk] *n* sədəqə ilə/nəzirlə yaşayan kasıblar

**alms-house** ['a:mzhaus] *n* əlillər evi *(şikəstləri, əlilləri, əldən düşmüş qocaları saxlamaq üçün xeyriyyə müəssisəsi)*

**almsman** ['a:mzmən] *n (pl* **-men** [-mən]*)* **1.** kasıb, yoxsul, sədəqə ilə dolanan/yaşayan; **2.** *arx.* hami, sədəqə verən adam

**alogy** ['æləd͡ʒı] *n arx.* mənasızlıq, cəfənglik; cəfəngiyyat, uydurma

**alone**[1] [ə'loun] *adj* **1.** kimsəsiz, tək, yalqız; **to be** ~ tək/yalqız/kimsəsiz olmaq; *She is alone O kimsəsizdir /yalqızdır;* **all / quite** ~ tamamilə tək/yalqız; **2.** ancaq, tamamilə; yeganə, təkcə, bircə; *He alone is to blame Ancaq o günahkardır; Science alone can solve it Bunu ancaq / bircə elm həll edə bilər;* **3.** təklikdə; ~ **with** *smb.* bir kəslə təklikdə

**alone**[2] [ə'loun] *adv* tək, yalqız; kimsəsiz; **to live** ~ tək / yalqız / kimsəsiz yaşamaq; **to sit** ~ tək/yalqız oturmaq; **to die** ~ kimsəsiz ölmək; *He lives alone O tək yaşayır; He works alone O tək işləyir;* **to leave** *smb.* ~, **to let** *smb.* ~ bir kəsi tək/yalqız buraxmaq, bir kəslə işi olmamaq; *Leave/Let me alone Məni tək burax/ buraxın; Leave that alone Onunla işin/ işiniz olmasın, Bu barədə danışma/danışmayın, yetər;*
◊ **let** ~ hələ; *I haven't the time, let alone the money Mənim vaxtım yoxdur, hələ pulu demirəm*

**along**[1] [ə'lɔŋ] *adv* **1.** irəli, irəliyə; **to go** ~ irəli hərəkət etmək; öz yolu ilə getmək; *They were told to move along Onlara irəli hərəkət etmək tapşırıldı;* ~ **here / there** bu / o istiqamətdə; **2.** **(with)** *Come along! Gedək!; Come along with us Bizimlə gedək; They carried me along with them Onlar məni özləri ilə apardılar; Fetch it along Bunu götür / özünlə apar;* **3.** artıq, daha; *The afternoon was well along Artıq günortadan keçib, Gün axşam olub; A man is well along in the years Kişi artıq / daha yaşa dolub;* **4.** *Birləşmələrdə işlədilir:* **right** ~ *amer.* həmişə, daim(a); **all** ~ lap əvvəldən, hər vaxt, həmişə; *He knew it all along O bunu həmişə / lap əvvəldən / hər vaxt bilirdi;* **to get** ~ **1)** yaşamaq, dolanmaq, həyat sürmək, güzəran keçirmək, ömür sürmək; **2)** xoşbəxt olmaq, xoşbəxt yaşamaq, səfa sürmək; *The man is getting along! Bu kişi xoşbəxt yaşayır / səfa sürür;* **to get** ~ **with 1)** nailiyyət / müvəffəqiyyət qazanmaq *(bir şeydə / işdə)*; **2)** irəliləmək *(təhsildə)*, bacarmaq; *How are you getting along with your English studies? İngilis dilini öyrənməyin /öyrənməyiniz necə gedir?* **3)** yola getmək, dolanmaq *(bir kəslə)*; *She does not get along with me O mənimlə yola getmir /dolanmır; Get/Go along with you! Rədd ol! Rədd olun buradan! Bəsdir! Kifayətdir! I'll be along in ten minutes Mən on dəqiqədən sonra qayıdacam*

**along**[2] [ə'lɔŋ] *prep Məkan mənasında işlənir:* boyunca, uzunu; **to walk** ~ **the river embankment** çay boyunca gəzmək, çay uzunu getmək; **to pass** ~ **the street** küçədə / küçə boyu gəzmək; **to sail** ~ **the coast** sahil boyu üzmək *(qayıqla və s.)*; *There were young trees along the river Çay boyunca cavan ağaclar vardı;* ~ **cottages by the lake** göl boyunca tikilmiş/ yerləşən kotteclər

**alongside**[1] [ə'lɔŋ'saıd] *adv* **1.** yaxınlığında, çox yaxın, yan-yana; böyür-böyürə; *dən.* göyərtə boyu/uzunu; **2.** divarına, divarına lap yaxın *(limanın, körpünün)*; **to tow a ship** ~ gəmini körpünün lap yaxınına yedəkləmək, gəmini yedəklə göyərtəyə yaxınlaşdırmaq; **to be** ~ körpüdə dayanmaq *(gəmi və s.)*; *It is difficult to get alongside Yan almaq/Yaxınlaşmaq çətindir; Come alongside! Yan alın!* **to deliver goods** ~ yükü gəminin göyərtəsinə aparmaq / yükləmək

**alongside**[2] [ə'lɔŋ'saıd] *prep* **1.** yanında, yaxınlığında; böyründə; **to sit** ~ **of** *smb.* bir kəsin yanında/böyründə oturmaq; *He stood alongside of me O mənim yanımda dayandı;* **2.** *(tez-tez* **of***)* *dən.* göyərtənin yanında; göyərtə boyu ilə, bort-borta; **to come** ~ **(of) a ship** gəminin göyərtəsinə yan almaq; *The ships lay alongside of each other Gəmilər göyərtə-göyərtəyə (yəni yan-yana) dururdu;* **to pass** ~ **of a ship** gəminin göyərtəsi boyu üzmək

**aloof** [ə'lu:f] *adv* **1.** uzaq, uzaqda, uzaqlarda; ~ **from the commotion** çaxnaşmadan /hərc-mərclikdən/hay-küydən uzaq; ~ **from excitement** həyəcandan uzaq; **2.** tək, tək-tənha, qərib kimi; laqeyd, laqeydliklə, etinasız, etinasızlıqla; **to keep oneself** ~ laqeyd olmaq/ qalmaq; **to stand oneself** ~ etinasız/laqeyd dayanmaq; uzaqlaşmaq, kənara çəkilmək, uzaq gəzmək; **coldly** ~ soyuqqanlılıqla laqeyd bir tərzdə; **proudly** ~ təşəxxüslə, məğrurluqla, təkəbbürlə, təkəbbürlü bir tərzdə



**aloofness** [ə'lu:fnıs] *n* soyuqluq, uzaqlıq *(əlaqədə, münasibətdə)*, laqeydlik, etinasızlıq; **icy** ~ buz kimi soyuqluq, laqeydlik; **to maintain** ~ laqeydlik göstərmək, laqeyd qalmaq

**aloud** [ə'laud] *adv* **1.** ucadan, hündürdən, bərkdən; **to speak/to read** ~ ucadan danışmaq/oxumaq; **to laugh** ~ ucadan/bərkdən gülmək; **to call** ~ **for help** ucadan / bərkdən köməyə çağırmaq; *The pain caused him to cry aloud Ağrı onu bərkdən qışqırmağa məcbur etdi;* **2.** dəhşətli; bərk; *It reeks aloud Bərk/Dəhşətli iylənir, Dəhşətli iy gəlir*

**alpha** ['ælfə] *n* **1.** alfa *(yunan əlifbasının birinci hərfi)*; **2.** *məc.* mənbə, qaynaq, başlanğıc; **A. and Omega** başlanğıc və son; mahiyyət, ən əsas; **3.** *astr.* bürcün ən parlaq ulduzu

**alphabet**[1] ['ælfəbıt] *n* **1.** əlifba; **the English /Azerbaijani/Russian** *etc.* ~ ingilis/Azərbaycan/rus əlifbası; **2.** *məc.* hər-hansı bir elm haqqında elementar bilik; elmin əsası; ~ **of Chemistry** kimyanın əsasları

**alphabet**[2] ['ælfəbıt] *v amer.* = **alphabetize**

**alphabetic** [.ælfə'betık] *adj* əlifba; ~ **arrangement** əlifba sırası, əlifba sırası ilə düzülmə

**alphabetical** [.ælfə'betıkəl] *adj* əlifba; ~ **order** əlifba sırası; *The words in a dictionary are in alphabetical order Lüğətdə sözlər əlifba sırası ilə düzülüb / verilib*

**alphabetically** [.ælfə'betıkəlı] *adv* əlifba sırası ilə, əlifba üzrə; *Put down these words alphabetically Bu sözləri əlifba üzrə düzün / yazın*

**alphabetize** ['ælfəbıtaız] *v* əlifba sırası ilə vermək / düzmək

**alpha particles** ['ælfə'pa:tıklz] *fiz.* alfa hissəciklər

**alpha rays** ['ælfə'reız] *fiz.* alfa şüaları

**al'phenic** [æl'fenık] *n əc.* qamış qəndi

**alphos** ['ælfəs] *n tib.* cüzam xəstəliyinin bir növü

**Alpine** ['ælpaın] *adj* **1.** Alp; Alp dağına aid olan; **2.** dağ, yüksək dağ; ~ **meadows** Alp / yüksək dağ çəmənlikləri; ~ **plants** Alp dağlarında bitən bitkilər; ~ **pastures** Alp otlaqları

**alpinist** ['ælpınıst] *n* alpinist

**already** [ɔ:l'redı] *adv* **1.** artıq; *When I came, they had already left the town Mən gələndə onlar artıq şəhəri tərk etmişdilər; Have you finished your work already? Sən/Siz işini/işinizi artıq qurtarmısan /qurtarmısınız?* **2.** əvvəllər; *I have been there already Mən əvvəllər orada olmuşam*

**alright** ['ɔ:l'raıt] *adv* = **all right**

**Alsatian** [æl'seıʃn] *n* canavara oxşar yekə it

**also** ['ɔ:lsou] *adv* da, də, həmçinin, dəxi; *She is also a doctor O həm də həkimdir*

**also ran** ['ɔ:lsourən] *n* **1.** cıdırda iştirak edən lakin üç yerdən birini tuta bilməyən at və ya it; **2.** idmanda və ya seçkidə qalib gəlməyən adam

**altar** ['ɔ:ltər] *n* **1.** mehrab, səcdəgah; **2.** qurbangah, qurban kəsilən yer; **3.** taxt *(xristian kilsələrində)*; **high** ~ əsas taxt; **4.** *məc.* kilsə, din; **to sacrifice at the** ~ qurban vermək, kilsəyə qurban gətirmək

**altar-fire** ['ɔ:ltə.faıər] *n* qurbanlıq od/atəşi

**alter** ['ɔ:ltər] *v* **1.** dəyişdirmək; **to** ~ ***one's*** **way of living / mode of life** yaşayış/həyat tərzini dəyişdirmək; **to** ~ **course** istiqaməti dəyişdirmək; **to** ~ ***one's*** **mind** fikrini dəyişdirmək, başqa qərar qəbul etmək; **to** ~ **radically** köklü surətdə/tərzdə dəyişdirmək; **to** ~ ***one's*** **arrangements** nəzərdə tutulmuş planı dəyişdirmək; **2.** dəyişiklik etmək, düzəltmək, şəklini dəyişmək; **to** ~ **a decree** dekretdə dəyişiklik etmək; **to** ~ **clothes** paltarı *(yenidən)* düzəltmək; *This shirt must be altered, it is too large Bu köynəyi düzəltmək lazımdır, o çox böyükdür;* **to** ~ **quantitatively** miqdarca dəyişdirmək; **3.** dəyişmək; *Baki has altered a great deal since 1990 1990-cı ildən Bakı xeyli dəyişib;* **to** ~ **subtly** sezilməz/ hissedilməz dərəcədə dəyişmək; **to** ~ **considerably** xeyli /hiss ediləcək tərzdə dəyişmək; *She has considerably altered since her illness O, xəstəlikdən sonra xeyli / hissediləcək dərəcədə dəyişib;* **4.** *amer. dial.* burmaq *(heyvanı və s.)*

**alterability** [.ɔ:ltərə'bılıtı] *n* dəyişmə, dəyişə bilmə, dəyişmə qabiliyyəti

**alterable** ['ɔ:ltərəbl] *adj* dəyişən, dəyişə bilən

**alteration** [.ɔ:ltə'reıʃn] *n* **1.** dəyişmə, dəyişdirmə; dəyişiklik; **basic** ~**s** əsaslı/köklü dəyişikliklər; **profound** ~**s** dərin/hərtərəfli dəyişmə; **to undergo important** ~**s** dərin / əsaslı / köklü dəyişikliklərə uğramaq/məruz qalmaq; **2.** hazır paltarı lazımi hala salmaq; **3.** *tib. (orqanizmdə)* dəyişiklik; **4.** *tex.* deformasiya *(formanın dəyişməsi)*; **5.** *hüq.* müqavilənin şərtinin dəyişməsi; **6.** *(əksərən cəmdə)* dəyişiklik; dəyişmə, dəyişdirmə; təbəddülat; **trifling** ~**s** kiçik / cüzi / balaca dəyişmələr; **subtle** ~**s** gözəgörünməyən / sezilməyən / hiss olunmayan dəyişmələr; **to make** ~**s** dəyişikliklər etmək; *There have been a few alterations to the time-table Cədvəldə bir neçə dəyişiklik edilmişdir*

**alterative** ['ɔ:ltərətıv] *adj* dəyişiklik yarada bilən / edə bilən

**altercate** ['ɔ:ltə:'keıt] *v* mübahisə etmək, deyişmək, höcətləşmək, çənələşmək; küsüşmək, arası dəymək

**altercation** [.ɔ:ltə:'keıʃn] *n* **1.** söyüşmə, deyişmə; söyüş; **2.** dalaşma, dava, qovğa; söz-söh-

bət; didişmə; **domestic** ~ ailə dalaşması / didişməsi / söz-söhbəti

**alternate**[1] [ɔ:l'tə:nɪt] *n* **1.** dəyişmə; növbə ilə bir-birini əvəz etmə/dəyişmə; növbələşmə; **2.** *dilç.* əvəzlənmə

**alternate**[2] [ˏɔ:l'tə:nət] *adj* **1.** dəyişən, növbəli, növbələşən, bir-bir gələn, bir-birinin ardınca gələn; ~ **day and night** bəzən gündüz, bəzən gecə; gah gündüz, gah gecə; ~ **capital and small letters** baş hərflərlə növbələşən sətri hərflər; **to work** ~ **shifts** növbə ilə işləmək; **to serve** ~ **shifts** növbə ilə xidmət etmək; ~ **bearing** *k.t.* növbəli/iki ildən bir bar verən/ gətirən; ~ **husbandary** *k.t.* toxumdəyişmə təsərrüfatı; **2.** *el.* dəyişən *(cərəyan haq.)*; **3.** hər ikidən bir; **on** ~ **days, each** ~ **day** bir gündən bir, günaşırı; **4.** ehtiyat; əvəz edə bilən; ~ **materials** əvəzedicilər, əvəzedici materiallar

**alternate**[3] ['ɔ:ltə:neɪt] *v* **1.** növbələşmək, növbələnmək, növbə ilə bir-birini əvəz etmək; *Wet days alternate with fine days Yağışlı günlərlə aydın günlər (yağışsız günlər) bir-birini əvəz edir; Fields alternated with meadows Çöllər çəmənliklərlə əvəz oldu; The flood and ebb alternate with each other Qabarma və çəkilmə növbələşir / bir-birini əvəz edir;* **2.** növbələşdirmək, növbələşmək; növbə ilə birini başqası ilə əvəz etmək; *He alternated kindness with severity O bəzən /gah mərhəmətli, bəzən də / gah da ciddi olurdu; Snow alternated with rain Gah qar, gah da yağış yağırdı, Qar yağışı, yağış isə qarı əvəz edirdi*

**alternately** [ɔ:l'tə:nətlɪ] *adv* növbə ilə, bir-birinin ardınca; bir-birini əvəz edərək

**alternating** ['ɔ:ltə:neɪtɪŋ] *adj* növbələşən, bir-birini əvəz edən, bir-birinin ardınca gələn; dəyişən; ~ **current** *el.* dəyişən cərəyan; **the** ~ **distance of the rocket from the Earth** raketlə yer arasında dəyişən məsafə

**alternation** [ˏɔ:ltə:'neɪʃn] *n* **1.** növbələşmə, növbə ilə bir-birini əvəz etmə; bir-birinin dalınca gəlmə; **periodical** ~ vaxtaşırı/ dövri növbələşmə; **endless** ~ sonsuz növbələşmə; **rapid** ~ cəld/sürətli növbələşmə; **the** ~ **of day and night** günün və gecənin bir-birini əvəz etməsi/növbələşməsi; **the** ~ **of cold and heat** soyuqla istinin növbələşməsi; ~ **of generations** nəsillərin bir-birini əvəz etməsi/dəyişməsi; **2.** *dilç.* əvəzlənmə; **sound** ~ səslərin əvəzlənməsi

**alternative**[1] [ɔ:l'tə:nətɪv] *n* alternativ; seçim; çıxış yolu, çarə, əlac; **undesirable** ~ arzuedilməz alternativ; **to propose** ~ alternativ təklif etmək; **to endorse** ~ alternativ qəbul etmək; **to reject** ~ alternativi rədd etmək; **to confront with** ~ alternativlə qarşılaşmaq; *There is no other alternative Başqa çıxış yolu / alternativ yoxdur;* **to have no** ~ alternativi olmamaq, alternativə malik olmamaq; *We must fight: there is no other alternative Biz vuruşmalıyıq, başqa çıxış yolumuz / əlacımız yoxdur*

**alternative**[2] [ɔ:l'tə:nətɪv] *adj* **1.** alternativ; ~ **way** alternativ yol; **2.** bir-birini inkar edən; *The two plans are not necessarily alternative Bu iki plan qətiyyən bir-birini inkar etmir;* **3.** ikincisi *(iki mümkün olan şeydən)*

**alternatively** [ɔ:l'tə:nətɪvlɪ] *adv* **1.** alternativ olaraq, alternativ kimi; **2.** *arx.* növbə ilə, bir-birinin ardınca

**alternator** ['ɔ:ltəneɪtə(r)] *n el.* alternator *(dəyişən cərəyan hasil edən generator)*

**although** [ɔ:l'ðou] *conj* baxmayaraq ki, hərçənd, da, də; *They are generous although they are poor Kasıb olsalar da, onlar əliaçıqdırlar; Although they tried hard, they did not succeed Ciddi çalışsalar da, onlar müvəffəqiyyət qazana bilmədilər; I'll be there, although I may be late Mən orada olacam, ola bilsin ki, gecikim, Mən geciksəm də orada olacam*

**alti** ['a:ltɪ] *n* **alto** *isminin cəm forması*

**altimeter** ['æltɪmi:tə(r)] *n* altimetr *(ucalığı təyin edən cihaz, xüs. təyyarədə)*, hündürlükölçən *(cihaz)*

**altitude** ['æltɪtju:d] *n* **1.** hündürlük, yüksəklik; dəniz səthinə nisbətən yüksəklik; **considerable** ~ nəzərəçarpacaq hündürlük; **dizzy** ~ başgicəllədici hündürlük / yüksəklik; **unattainable** ~ əlçatmaz/əlyetməz yüksəklik; **to gain an** ~ **of** müəyyən yüksəkliyə çatmaq / yetmək; *At high altitudes it is difficult to breathe Hündür yüksəklikdə nəfəs almaq çətin olur;* **to live at an** ~ **of** yüksəklikdə yaşamaq; *We live at an altitude of 1500 metres Biz dəniz səviyyəsindən 1500 m yüksəklikdə yaşayırıq;* **2.** *pl* yüksək yer, yüksəklik; *It is difficult to climb altitudes Yüksəkliyə dırmaşmaq çətindir*

**alto** ['æltou] *n (pl* **-os** [-ouz]) *mus.* alt *(***1)** *qadın və ya uşağın alçaq səsi;* **2)** *xorda alt səslə oxuyan adam;* **3)** *skripkadan bir az böyük simli musiqi aləti)*

**alto-clarinet** ['æltouˏklærɪ'net] *n* alt klarnet, alt səsə malik klarnet

**alto-flute** ['æltou'flu:t] *n* alt fleyta, alt səsə malik fleyta *(nəfəsli musiqi aləti)*

**altogether** [ˏɔ:ltə'geðə(r)] *adv* bütünlükdə, büsbütün, cəmi, tamamilə; *It is not altogether bad Bu bütünlüklə pis deyil; It was raining, but altogether it was a good trip Yağış yağırdı, lakin/amma bütünlüklə səyahət yaxşı oldu; There are alto-gether ten students in the group Qrupda bütünlükdə / cəmi on tələbə var;*

◊ **in the** ~ çılpaq, lüt, paltarsız, üryan *(qadın, model və s.)*; **for** ~ *arx.* həmişəlik, ömürlük

**alto-trombone** ['æltoutrɔm'boun] *n* alt trombon *(musiqi aləti)*

**altruism** ['æltruɪzm] *n* altruizm *(öz mənafeyini unudub başqalarının qeydinə qalma)*; **genuine** ~ əsl / həqiqi altruizm





**altruist** ['æltruɪst] *n* altruist *(altruizmi rəhbər tutan adam)*

**altruistic** [ˏæltru'ɪstɪk] *adj* altruist

**altruistically** [ˏæltru'ɪstɪkəlɪ] *adv* altruist kimi

**alum** ['æləm] *n* zəy

**aluminium** [ˏælju'mɪnjəm] *n* alümin, alüminium, *(gümüşü rəngli yüngül metal)*

**aluminum** [ə'lju:mɪnəm] *n amer.* = **aluminium**

**alvine** ['ælvɪn] *adj* bağırsaq; ~ **discharge** nəcis ifraz etmə, qarnını boşaltma

**always** ['ɔ:lweɪz] *adv* həmişə, daim, hər vaxt /zaman, müdam; **not** ~ həmişə yox, hər zaman/ vaxt yox; *The sun always rises in the east Günəş həmişə / müdam / hər zaman şərqdən çıxır; I will love you always Mən səni/sizi həmişə/ müdam sevəcəm*

**am** *tam forması:* [æm], *reduksiya olunmuş formaları:* [əm, m] **to be** *felinin 1-ci şəxs tək forması*

**a.m.**['eɪ, 'em] **ante meridiem** *söz birləşməsinin qısa forması. Zaman bildirən rəqəmlərdən sonra işlədilir: 8 a.m. Səhər saat səkkiz*

**amability** [ˏæmə'bɪlɪtɪ] *n* heyranedicilik, cazibədarlıq, füsunkarlıq; qəşənglik, cazibə, gözəllik

**amadou** ['æmədu:] *n* ağacgöbələyi

**amalgam** [ə'mælgəm] *n kim.* amalqama *(civə ilə bəzi metalların ərintisi; qatışıq, xəlitə)*

**amalgamate** [ə'mælgəmeɪt] *v* **1.** birləşdirmək; bitişdirmək; **to** ~ **companies** kompaniyaları birləşdirmək; **2.** civə ilə birləşdirmək, metalın üzünə civə çəkmək; amalqamalamaq; civə vasitəsilə filizdən qızılı və gümüşü ayırmaq

**amalgamation** [əˏmælgə'meɪʃn] *n* **1.** birləşmə; qovuşma; ~ **of railway companies** dəmiryol şirkətlərinin birləşməsi; **industrial** ~ sənaye müəssisələrinin birləşməsi; **compulsory** ~ məcburi / icbari birləşmə; **2.** qarışma; **racial** ~ irqi qarışma; **ethnic** ~ etnik qarışma; **3.** amalqamasiya, amalqalaşdırma *(metalın üzünə civə çəkmə; civə vasitəsilə filizdən qızılı və gümüşü ayırma üsulu)*

**amass** [ə'mæs] *v* **1.** yığmaq, toplamaq *(pul, mal, məlumat və s.)*; **to** ~ **riches** var-dövlət yığmaq /toplamaq; **2.** *arx.* toplaşmaq, yığışmaq, yığılmaq, cəmləşmək; *The clouds amassed above the hill Buludlar təpənin üstünə toplaşdı / yığıldı*

**amassment** [ə'mæsmənt] *n* **1.** yığışma, toplaşma; **2.** güruh, dəstə, yığnaq

**amateur**[1] ['æmətə:(r)] *n* **1.** həvəskar, qeyri-professional; **enthusiastic** ~ entuziast-həvəskar; **gifted** ~ istedadlı həvəskar; **2.** diletant *(hər hansı bilik sahəsində səthi məlumatı olan adam)*; **mere** ~ sadəcə olaraq diletant; **complacent** ~ özündən razı diletant, müştəbeh diletant

**amateur**[2] ['æmətə:(r)] *adj* həvəskar, qeyri-professional; ~ **football** həvəskar / qeyri-professional futbol; ~ **painter / composer /musician,** *etc.* həvəskar rəssam / bəstəçi /musiqiçi və s.; ~ **sportsman** həvəskar idmançı; **an** ~ **actor** həvəskar aktyor

**amateurish** [ˏæmə'tə:rɪʃ] *adj* qeyri-professional; diletant; bacarıqsız, qabiliyyətsiz; pis; ~ **attempt** diletant cəhd

**amateurishly** [ˏæmə'tə:rɪʃlɪ] *adv* diletantcasına, diletant kimi; qeyri-professional, naşıcasına

**amateurishness** [ˏæmə'tə:rɪʃnɪs] *n* diletantlıq, qeyri-professionallıq, naşılıq

**amateurism** [ˏæmə'tə:rɪzm] *n* diletantizm, diletantlıq

**amateurship** ['æmə'tə:ʃɪp] *n* diletantizm, diletantlıq; naşılıq

**amatory** [ˏæmətərɪ] *adj* şəhvani, aşiqanə; **an** ~ **look** aşiqanə / şəhvani baxış

**amaze**[1] [ə'meɪz] *n şair* heyranlıq, məftunluq

**amaze**[2] [ə'meɪz] *v* heyrətə salmaq, heyrətləndirmək; heyran etmək, mat qoymaq; **to** ~ ***smb.*** **by/with** ***smth.*** bir kəsi bir şeylə heyrətə salmaq; **to be ~d at** ***smth.*** bir şeyə mat qalmaq; **to be speechlessly ~d** heyrətdən/təəccübdən danışa bilməmək/nitqi tutulmaq; *She is utterly amazed O tamamilə mat qalıb*

**amazed** [ə'meɪzd] *adj* çox heyrətlənmiş / təəccüblənmiş, mat qalmış, valeh olmuş

**amazedly** [ə'meɪzdlɪ] *adv* heyrətlə, təəccüblə, matmat, heyranlıqla, heyran olmuş / qalmış tərzdə

**amazedness** [ə'meɪzdnɪs] *n* təəccüb, heyrət, heyranlıq

**amazement** [ə'meɪzmənt] *n* heyrət, təəccüb; **blank** ~ tam heyrət/təəccüb; **sheer** ~ son dərəcə heyrət; ~ **in mute** təəccübdən donub qalma; ~ **at** ***smth.*** bir şeydən təəccüblənmə/heyrətlənmə; **with** ~ təəccüblənmiş halda, heyrətlə, heyrət içərisində; *To my amazement I came first Təəccüblü olsa da, mən birinci gəldim*

**amazing** [ə'meɪzɪŋ] *adj* qəribə, təəccüblü; valehedici, son dərəcə gözəl, heyranedici; ~ **skill** valehedici/heyranedici bacarıq; ~ **speed** təəccübləndirici/ heyranedici sürət; ~ **woman** qəribə/heyranedici/gözəl qadın; *Your wife is an amazing woman Sənin/Sizin arvadın/arvadınız son dərəcə gözəl qadındır*

**amazingly** [ə'meɪzɪŋlɪ] *adv* son dərəcə gözəl, çox gözəl, valehedici tərzdə, təəccüblü, qəribə; **to speak** ~ çox gözəl /valehedici bir tərzdə danışmaq

**Amazon** ['æməzən] *n* **1.** amazonka **1)** *qədim yunan əsatirində cəngavər qadın;* **2)** *atlı qadın;* **3)** *ata minmək üçün uzun qadın paltarı)*; **2.** kişi kimi/kişiyə bənzər qadın

**amazonian** [ˏæmə'zounjən] *adj* **1.** amazonkaya aid, amazonka üçün xarakterik / səciyyəvi olan; **2.** kişiyəoxşar, kişiyəbənzər, kişisifət

**ambassador** [æm'bæsədə(r)] *n* **1.** səfir; fövqəladə səfir; **Ambassador Plenipotentiary** səlahiyyətli səfir; **Ambassador Extraordinary and Plenipotentiary** fövqəladə və səlahiyyətli səfir; **Ordinary/ Resident** ~ daimi səfir; **to exchange ~s** səfir mübadiləsi etmək; **to raise**

**to the rank of** ~ səfir rütbəsinə qaldırmaq; 2. elçi, nümayəndə; carçı, müjdəçi; **an ~ of peace** sülh müjdəçisi/carçısı; **goodwill** ~ xoşniyyətli elçi/nümayəndə; **to act as** ***smb.'s*** **~ in a negotiation** danışıqda bir kəsin elçisi/nümayəndəsi kimi çıxış etmək

**ambassadorial** [æm.bæsə'dɔ:rıəl] *adj* səfir; **~ talks** səfir səviyyəsində aparılan danışıqlar, səfirlər arasında olan danışıqlar

**ambassadorship** [æm'bæsədəʃıp] *n* 1. səfir rütbəsi; 2. səfir, səfir səlahiyyəti və funksiyası

**ambassadress** [æm'bæsədrıs] *n* 1. səfirin arvadı; 2. qadın səfir; 3. qadın elçi/nümayəndə

**amber**[1] ['æmbə^r] *n* 1. kəhrəba; 2. kəhrəba rəngi

**amber**[2] ['æmbə^r] *adj* 1. kəhrəba; 2. sarı, kəhrəba rəngi; **~ bracelet** kəhrəba qolbağı; **~ beads** kəhrəba muncuq

**ambery** ['æmbərı] *adj* kəhrəba xassəli/ rəngli

**ambiguity** [.æmbı'gju:ıtı] *n* aydın/bəlli olmama; qeyri-müəyyənlik, anlaşılmazlıq; ikimənalılıq; **to express oneself with** ~ ikimənalı/ ikibaşlı /qeyri-müəyyən danışmaq, müəmmalı danışmaq; *There is a slight ambiguity in her words Onun sözlərində bir az/balaca anlaşılmazlıq var;* **to answer without any** ~ açıq / aydın cavab vermək; **to use ambiguities** müəmmalı /ikibaşlı danışmaq

**ambiguous** [æm'bıgjuəs] *adj* 1. ikimənalı, eyhamlı; **an ~ reply** ikimənalı / ikibaşlı söz; 2. aydın olmayan, aşkar olmayan; anlaşılmaz; ikibaşlı; **~ answer** anlaşılmaz / şübhəli / ikibaşlı cavab; **~ statement** ikimənalı / iki cür başa düşülə biləcək bəyanat; **~ style** anlaşılmaz üslub

**ambiguously** [æm'bıgjuəslı] *adv* qeyri-dəqiq, anlaşılmaz bir tərzdə, müəmmalı, ikibaşlı; **to speak** ~ müəmmalı / ikibaşlı danışmaq

**ambiguousness** [æm'bıgjuəsnıs] *n* anlaşılmazlıq, qeyri-müəyyənlik, müəmmalılıq

**ambit** ['æmbıt] *n* 1. hədd, hüdud, sərhəd, diapazon *(həcm, miqdar, dərəcə haq.)*; **within the ~ of** həcmində, hüdudunda; 2. sahə, dairə

**ambition** [æm'bıʃn] *n* 1. şöhrətpərəstlik; hakimiyyətpərəstlik, mənsəbpərəstlik; **tremendous** ~ son dərəcə/çox böyük şöhrətpərəstlik/hakimiyyətpərəstlik/mənsəbpərəstlik; **youthful** ~ gənclik şöhrətpərəstliyi; **to have no ~ whatever** heç bir damcı şöhrətpərəstliyi / mənsəbpərəstliyi olmamaq; 2. *pl* şöhrətpərəst fikir/niyyət; **to achieve ~s** şöhrətpərəst arzuları həyata keçirmək; **to attain ~s** şöhrətpərəst arzuları həyata keçirməyə nail olmaq; 3. can atma, cəhd; arzu; **lifelong** ~ ömür boyu can atma/cəhd göstərmə; **sole** ~ tək /yeganə arzu; **absurd** ~ boş/mənasız arzu / cəhd; **lofty ~s** nəcib arzu / cəhd; **~ for** ***smth.*** bir şeyə cəhd etmə/can atma; **~ to do** ***smth.*** bir şeyi etməyə cəhd göstərmək; **~ to be** ***smb.*** bir kəs olmağa cəhd etmək; 4. arzu, amal, istək; *It is my ambition to be a doctor Mənim arzum həkim olmaqdır*

**ambitionist** [æm'bıʃənıst] *n* şöhrətpərəst adam

**ambitious** [æm'bıʃəs] *adj* 1. şöhrətpərəst; şöhrətpərəstlik; **an ~ man** şöhrətpərəst adam; *He is an ambitious man O şöhrətpərəst adamdır;* **~ artist/writer/poet/painter,** ***etc.*** şöhrətpərəst aktyor/yazıçı/şair/rəssam *və s.*; **extremely** ~ çox/həddən artıq şöhrətpərəst; **~ plans** şöhrətpərəst niyyətlər/planlar; **~ program** geniş /nəhəng proqram; 2. *(bir şeyə)* can atan adam; **~ for/of power** hakimiyyətə can atan; **~ of wealth/honour** dövlətə / şöhrətə can atan; **~ to do** ***smth.*** bir şey etmək arzusunda olan; 3. gözəl, zərif, incə; təmtəraqlı; ibarəli, qəliz; **~ style** qəliz / təmtəraqlı üslub

**ambitiously** [æm'bıʃəslı] *adv* şöhrətpərəstcəsinə; şöhrətpərəst bir tərzdə/qaydada/surətdə; **to speak/to act/to behave,** ***etc.*** ~ şöhrətpərəstcəsinə danışmaq / hərəkət etmək / davranmaq *və s.*

**ambitiousness** [æm'bıʃəsnıs] *n* şöhrətpərəstlik

**ambivalence** [æm'bıvələns] *n* 1. ikiillik; ikitərəflilik; iki tərəfə meyl etmə; 2. ikiüzlülük

**ambivalent** [æm'bıvələnt] *adj* 1. ikili, ikitərəfli, iki tərəfə meyl edən; **to display an ~ attitude to** ***smth.*** bir şeyə ikitərəfli münasibət göstərmək; 2. ikiüzlü

**amble**[1] ['æmbl] *n* 1. yorğa, yorğa yeriş *(at və s.)*; 2. yüngül yeriş

**amble**[2] [æmbl] *v* 1. yorğa qaçmaq; yorğa at minmək; 2. yüngül yerişlə getmək, qısa addımlarla yerimək; **to ~ lazily** tənbəl-tənbəl yerimək; **to ~ along** xırda-xırda yerimək, kiçik addımlarla tez-tez yerimək, səkmək

**ambler** ['æmblə^r] *n* yorğa at

**ambling** ['æmblıŋ] *n* yorğa yeriş

**amblosis** [æm'blousıs] *n tib.* uşaq saldırma, uşaq salma, abort

**ambolic**[1] [æm'bɔlık] *n tib.* uşaq salma üçün işlədilən vasitə / dərman / dava

**ambolic**[2] [æm'bɔlık] *adj tib.* abort/uşaq salma törədən

**ambry** ['æmbrı] *n* 1. balaca şkaf; 2. anbar

**ambulance**[1] ['æmbjuləns] *n* 1. səhra xəstəxanası; 2. təcili yardım maşını, ambülans; 3. *hərb.* lazaret; sanitar-nəqliyyat vasitələri *(avtomobil, təyyarə və s.)*; 4. həkim məntəqəsi

**ambulance**[2] ['æmbjuləns] *adj* təcili yardım; **~ airplane** sanitar/təcili yardım təyyarəsi; **~ orderly** *hərb.* növbətçi sanitar əsgər/sanitar maşın; **~ station for accidents** təcili yardım stansiyası; **~ tent** sarıq çadırı / alacığı; **~ car** sanitar maşını / avtomobili

**ambulant** ['æmbjulənt] *adj* 1. səyyar, bir yerdən digərinə hərəkət edən; **~ merchant** səyyar, xırdavatçı, çərçi; 2. gəzən, bədənin bir yerindən başqa yerinə keçən *(ağrı haq.)*; 3. daimi rejim tələb etməyən *(xəstəlik haq.)*; 4. *tib.* ambulator, ambulatoriya; **~ clinic** səyyar ambulatoriya/ müalicəxana



**ambush**[1] ['æmbuʃ] *n* pusqu, marıq; **to lie/to lurk in** ~ pusquda/marıqda durmaq; **to make/to lay an** ~ pusqu düzəltmək, pusquda durmaq, marığa yatmaq

**ambush**[2] ['æmbuʃ] *v* pusqudan hücum etmək; pusqu qurmaq

**ameer** [ə'mıə^r] *n* əmir

**amen**[1] ['a:'men] *n* 1. amin; **to say ~ to** ***smth.*** bir şeyə amin demək; 2. *zaraf.* bəyənmək *(bir şeyi)*, razılığını vermək *(bir şeyə)*; 3. nəticə, yekun sözü; **to sing the** ~ qurtarmaq, amin demək

**amen**[2] ['a:'men] *v arx.* 1. amin demək; 2. bir şeyi təntənəli şəkildə / tərzdə təsdiq etmək

**amen**[3] ['a:'men] *inter Amin, Qoy belə olsun*

**amend**[1] [ə'mend] *n d.d.* = **amends**

**amend**[2] [ə'mend] *v* 1. düzəltmək, yaxşılaşdırmaq, yaxşılığa doğru dəyişdirmək; **to ~** ***one's*** **way of living** həyat tərzini dəyişdirmək *(yaxşılığa doğru); Amend your manners Özünü/Özünüzü yaxşı apar!/ aparın!* 2. yaxşılaşmaq, qüsurlardan qurtarmaq; *It is never late to amend Özünü düzəltmək heç vaxt gec deyil;* 3. düzəliş aparmaq / etmək; **to ~ a text** mətndə düzəliş aparmaq / etmək; **to ~ a Bill** qanun layihəsində düzəliş etmək / aparmaq; 4. *arx.* təmir etmək, düzəltmək

**amendable** [ə'mendəbl] *adj* islah oluna bilən, düzəldilə bilən; yaxşılaşdırıla bilən

**amendment** [ə'mendmənt] *n* 1. yaxşılaşma, yaxşılaşdırma, yaxşılaşdırılma; təkmilləşmə; islah olunma; 2. *(əlavə)* düzəliş, təshih, təshih etmə; **to move / to propose an ~ to the Bill** qanun layihəsinə düzəliş təklif etmək; **to move/to propose an ~ to the resolution** qətnaməyə düzəliş irəli sürmək/təklif etmək; **to propose/to move an ~ to the text** mətndə düzəliş edilməsini təklif etmək; **to make/to insert an** ~ dəyişiklik etmək; **to reject an** ~ dəyişiklik aparmağı rədd etmək; **to second an** ~ dəyişikliyi müdafiə etmək, dəyişiklik edilməsinə tərəfdar çıxmaq; *This plan needs some amendment before it can be made public Bu planı müzakirəyə çıxartmazdan əvvəl onda bəzi dəyişiklik etməyə ehtiyac var;* 3. *hüq.* təshih, düzəliş *(məhkəmə prosesində, yarışda)*; 4. yaxşılaşma *(xəstəliyin gedişində)*; 5. *k.t.* torpağın yaxşılaşması- /yaxşılaşdırılması

**amends** [ə'mendz] *n* 1. *(Özündən sonra fel təkdə işlədilir)* yüngülləşdirmə, yumşaltma; əvəzini vermə; **to make** ~ günahı yüngülləşdirmək /yumşaltmaq, əvəzini vermək, günahını yumaq; *To make amends Tom brought her flowers Günahını yumaq üçün Tom ona gül gətirdi;* 2. *hüq.* kompensasiya *(əvəz, qarşılıq)*, dəymiş ziyanın ödənilməsi

**amenity** [ə'mi:nıtı] *n* 1. xoşluq, yaxşılıq; gözəllik, qəşənglik; lətafət, məlahət; ləzzət; yumşaqlıq; **the ~ of the Californian climate** Kaliforniya iqliminin/ab-havasının gözəlliyi /ləzzəti/ lətafəti / qəşəngliyi; **the ~ of temper** xarakterin yumşaqlığı; 2. gülərüzlülük; iltifat, lütfkarlıq; 3. *pl* gözəllik, qəşənglik; məlahət, zəriflik, cazibə; **amenities of nature** təbiətin gözəlliyi / cazibəsi; **amenities of home life** ailə həyatının ləzzəti / gözəlliyi / cazibəsi; 4. rahatlıq, uyğunluq, qolaylıq

**American**[1] [ə'merıkən] *n* 1. amerikalı; **the ~s** *top.i.* amerikalılar; 2. Amerika sakini, Amerika qitəsində doğulan; 3. ingilis dilinin Amerika variantı, amerikan ingiliscəsi

**American**[2] [ə'merıkən] *adj* Amerika, amerikan; **~ Revolution** Amerika inqilabı *(ABŞ-ın müstəqilliyi uğrunda gedən müharibə 1775-1783-cü illər)*; **~ Indian** Şimali Amerika hindusu; **~ ash** *bot.* amerikan göyrüşü; **~ chestnut** amerikan şabalıdı; **~ cockroach** amerikan tarakanı

**Americanism** [ə'merıkənızm] *n* 1. amerikanizm *(Amerikada işlədilən söz və ya ifadə)*; 2. amerikan adəti

**Americanization** [ə.merıkən(a)ı'zeıʃn] *n* amerikanlaşma

**Americanize** [ə'merıkənaız] *v* 1. amerikanlaşdırmaq; 2. *(nitqində)* amerikanizm işlətmək; 3. Amerika vətəndaşlığı vermək

**amiability** [.eımjə'bılıtı] *n* 1. mehribanlıq, səmimilik, xeyirxahlıq; gülərüzlülük, iltifat, lütfkarlıq; **sincere** ~ səmimi iltifat / lütfkarlıq; 2. mehribançılıq, üzügülərlik, xoşüzlülük, nəvazişkarlıq; həlimlik, sadədillik, sadəlik, rəhmdillik; **condescending** ~ təkəbbürlü mehribançılıq /nəvazişkarlıq; 3. *arx.* cazibə, cazibədarlıq, məlahət

**amiable** ['eımjəbl] *adj* 1. gülərüzlü, mehriban, lütfkar, iltifatlı; **an ~ woman** gülərüz / mehriban qadın; **sincerely** ~ səmimi mehriban / gülərüz / lütfkar / iltifatlı; 2. nəvazişkar, üzügülər, qəşəng, sevimli; **an ~ child** qəşəng / sevimli / üzügülər uşaq; 3. *arx.* cazibədar, füsunkar, heyranedici, çox gözəl, çox qəşəng; **an ~ girl** cazibədar / çox gözəl / çox qəşəng qız

**amiably** ['eımjəblı] *adv* gülərüzlə, iltifatla, mehribanlıqla, lütfkarlıqla; **to speak** ~ gülərüzlə/mehribanlıqla/xoşsifətlə/lütfkarlıqla danışmaq; **to behave** ~ lütfkarlıqla / gülərüzlə / mehribanlıqla / xoş sifətlə rəftar etmək

**amicability** [.æmıkə'bılıtı] *n* mehribanlıq, səmimilik, dostcasına əlaqə /münasibət, xeyirxahlıq

**amicable** ['æmıkəbl] *adj* 1. dost, dostluq, mehribancasına; səmimi, xeyirxah; **~ relations** dostluq əlaqələri; **~ meeting** dostcasına / səmimi görüş, dostluq görüşü; 2. sülh, sülh yolu ilə; xoşluqla olan, razılıqla olan; mübahisəsiz, dostcasına; **~ settlement** *(məsələnin)* sülh yolu ilə / xoşluqla /dostcasına həlli; **to settle difficulties in an ~ way** çətinlikləri sülh yolu ilə/razılıqla/ xoşluqla / dostcasına həll etmək

**amicably** ['æmıkəblı] *adv* dostcasına, mehribancasına, dostyana, səmimiyyətlə, xeyirxahlıqla;

sülhlə, sülh yolu ilə, dinc, sakitcə; **to live ~** dostcasına/mehribancasına/səmimiyyətlə/dinc /sakitcə yaşamaq

**amid** [ə'mıd] *prep* arasında; əhatəsində; içərisində; **~ the trees** ağacların arasında / əhatəsində; **villages ~ the woodlands** meşələrin əhatəsindəki kəndlər; **to be unseen ~ the throng** izdiham içərisində görünməz olmaq; *He felt strange amid so many people O özünü bu qədər adam arasında yad hiss etdi*

**amidst**[1] [ə'mıdst] *adv* ortasında, içərisində

**amidst**[2] [ə'mıdst] *prep* = **amid**

**amiss** [ə'mıs] *adv* **1.** səhvən, səhv/yanlış olaraq, düzgün olmayaraq; pis; **to take** ***smth.*** **~** bir şeyi səhvən/səhv olaraq başa düşmək; bir şeydən incimək; **to act/ to do ~** pis hərəkət etmək, yanlışlığa yol vermək; **to think ~** *(bir kəs/şey haqqında)* pis düşünmək; *What is amiss? Nə olub? Nə baş verib?;* **2.** yersiz, münasibətsiz, namünasib; **to come ~** namünasib vaxtda gəlmək; *Nothing comes amiss to him Ona hər şey yarayır, O hər şeydən xeyir götürür;*

◊ *Nothing comes amiss to a hungry stomach at. söz. Ac qarın üçün hər şey yarayar, Ac qarına nə versən qəbul edər;* ≅ *Aclıq ən yaxşı aşpazdır*

**amity** ['æmıtı] *n* mehribanlıq, səmimilik, dostcasına əlaqə/münasibət *(xüs. dövlətlər arasında)*, razılıq; *They lived in amity with their neighbour Onlar qonşuları ilə mehriban yaşayırdılar*

**ammeter** ['æmıtə'] *n el.* ampermetr

**ammonia**[1] [ə'mounjə] *n* **1.** *kim.* ammonyak; **2.** *d.d.* naşatır spirti, ammonium xlorid

**ammonia**[2] [ə'mounjə] *adj:* **~ solution/spirit** naşatır spirti, ammonium-hidroksid

**ammoniac** [ə'mounıæk] *adj kim.* ammonyaklı, ammonyak

**ammonite** ['æmənaıt] *n geol.* ammonit *(partlayıcı maddə)*

**ammonium** [ə'mounjəm] *n kim.* ammonium *(bir çox duzların tərkibində olan, amma sərbəst halda tapılmayan kimyəvi maddə)*

**ammunition**[1] [ˌæmju'nıʃn] *n* **1.** *hərb.* döyüş sursatı, patron, güllə; **2.** *məc.* müdafiə, mühafizə; himayə, dayaq; **3.** *top.i arx.* hərbi sursat

**ammunition**[2] [ˌæmju'nıʃn] *adj:* **1.** patron; **~ bearer/number** patron daşıyan/gətirən; **~ belt** patrondaş, patron qabı, patron lenti; **~ clip** patron darağı; **2.** hərbi sursat **~ dump** hərbi sursatın səhra anbarı; **~ distributing point** hərbi sursatın paylanma/bölüşdürmə məntəqəsi; **~ lot** hərbi sursat partiyası *(bir dəfə gətirilən hərbi sursat);*

◊ **~ leg** ayaq protezi, ağacdan düzəldilmiş ayaq

**ammunition**[3] [ˌæmju'nıʃn] *v hərb.* hərbi sursatla təmin etmək

**amnesia** [æm'nı:zjə] *n tib.* amneziya *(huşsuzluq, hafizənin pozulması /zəifləməsi)*

**amnestic** [æm'nestık] *adj tib.* hafizənin itirilməsinə səbəb olan

**amnesty**[1] ['æmnestı] *n* amnistiya, əfv etmə *(hökumət qərarı ilə müəyyən qrup müqəssirlərin bağışlanması və ya cəzalarının azaldılması)*; **general /complete/ partial ~** ümumi / tam / qismən amnistiya; **to proclaim/to grant ~** amnistiya elan etmək / vermək; **to be included in the ~** amnistiya siyahısına daxil olunmaq, amnistiyaya düşmək

**amnesty**[2] ['æmnestı] *v hüq.* amnistiya vermək, əfv etmək; bağışlamaq, təqsirindən /suçundan keçmək

**among** [ə'mʌŋ] *prep* **1.** arasında; **a village ~ the hills** təpələr arasında kənd; **a house ~ the trees** ağaclar arasında ev; **one ~ many** çoxlardan biri; *Among guests were two actors Qonaqların arasında iki aktyor vardı;* **to be ~ friends** dostların arasında olmaq; *It is one example among many Bu çox misallardan ancaq biridir; He lived among scholars O, alimlər arasında yaşadı;* **wittiest ~ poets** şairlər arasında ən ağıllısı; **fairest ~ women** qadınlar arasında ən gözəli; *Paris is among the largest cities in the world Paris dünyanın ən böyük şəhərləri arasındadır;* **to divide property ~ the heirs** əmlakı varislər arasında bölmək; **lasting peace ~ the peoples** xalqlar arasında möhkəm sülh; **2.** öz aralarında; öz aranızda *və s.; They quarrel among themselves Onlar öz aralarında mübahisə edirlər; Settle it among yourselves Bunu öz aranızda həll edin;* **3.** birlikdə, bahəm; *Do it among you! Bunu birlikdə/bahəm edin!;* **~ other things** bundan başqa; *Among other things he said that... Bundan başqa o dedi ki,...;* **4.** -dan, -dən, içərisindən; *He passed among the crowd O, izdihamın içərisindən keçdi*

**amongst** [ə'mʌŋst] *prep* = **among**

**amoral** [æ'mɔrəl] *adj* əxlaqsız, əxlaq qaydalarına zidd; ədəbsiz, pozğun; **an ~ child** əxlaqsız/ ədəbsiz / pozğun uşaq

**amorality** [ˌæmə'rælıtı] *n* əxlaqsızlıq, ədəbsizlik, pozğunluq

**amorous** ['æmərəs] *adj* **1.** tez vurulan, tez bənd olan, tez aşiq olan, tez-tez aşiq olan; **2.** aşiq, vurğun, məftun; **sweetly ~** hərarətlə sevən; **passionately ~** ehtirasla/ şövqlə / qızğın / dəlicəsinə sevən; **3.** eşq, sevgi, məhəbbət; aşiqanə; **~ songs/letters** aşiqanə mahnılar/məktublar, sevgi məktubları/mahnıları; **~ looks** aşiqanə baxışlar

**amorously** ['æmərəslı] *adv* məhəbbətlə, aşiqcəsinə, vurğuncasına, aşiqanə; sevə-sevə, həvəslə

**amorousness** ['æmərəsnıs] *n* **1.** tez bənd olma, tez-tez aşiq olma; **2.** aşiqlik, vurğunluq, məftunluq; məhəbbət

**amorphism** [ə'mɔ:fızm] *n* amorfizm, formasızlıq, şəkilçisizlik

**amorphous** [ə'mɔ:fəs] *adj* **1.** amorf, formasız; **~ plans** amorf/formasız planlar; **2.** xaotik, nizamsız, qarmaqarışıq, qarışıq, qaydasız; dağınıq;



aydın olmayan, anlaşılmaz; qeyri-müəyyən; **3.** *tex., biol.* amorf, quruluşu olmayan

**amorphously** [ə'mɔ:fəslı] *adv* amorf, amorf bir tərzdə / surətdə, xaotik bir tərzdə

**amorphousness** [ə'mɔ:fəsnıs] *n* **1.** amorfluq, formasızlıq; **2.** xaotiklik, qarmaqarışıqlıq; anlaşılmazlıq; qeyri-müəyyənlik

**amort**[1] [ə'mɔ:t] *adj arx.* cansız, ruhsuz; ölgün, sakitlik; məyus, qəmgin, həzin; dilxor, sarsılmış

**amort**[2] [ə'mɔ:t] *adv arx.* cansız, cansız bir tərzdə, ölgün tərzdə; qəmgin-qəmgin, həzin-həzin, məyus-məyus

**amortisement** [ə'mɔ:tızmənt] *n* = **amortization**

**amortisseur** [a:ˌmɔ:tı'sə:'] *n fr. tex.* dempfer *(müxtəlif alət və cihazlarda mexaniki rəqsi zəiflətmək üçün qurğu)*, amortizator *(avtomobil, təyyarədə və s.-də zərbəni azaldan qurğu)*

**amortizable** [ə'mɔ:tızəbl] *adj* **1.** ödənilə bilən, ödənilməsi mümkün olan *(borc haq.)*; **2.** ləğv edilə bilən

**amortization, -sation** [əˌmɔ:tı'zeıʃn] *n* **1.** *hüq.* amortizasiya *(avadanlığın işlənməsi nəticəsində onun qiymətinin azalması;* **2.** *hüq.* borcun tədriclə ödənilməsi; **3.** *tex.* avtomobil, təyyarə və sairədə zərbə təsirinin azaldılması; **4.** *id.* yerə enərkən və ya təkan zamanı zərbəni azaltma *(yüngül atletika)*

**amortize, -ise** [ə'mɔ:taız] *v hüq.* borcu hissə-hissə ödəmək; amortizasiya etmək; **2.** özgələşdirmədən mülkü hüquqi şəxsə vermək

**amotion** [ə'mouʃn] *n arx.* **1.** uzaqlaşdırma, uzaqlaşdırılma, kənar etmə / edilmə; azad etmə/ edilmə, çıxartma, çıxardılma; **2.** mülkiyyət hüququndan məhrum etmə

**amount**[1] [ə'maunt] *n* **1.** miqdar, say, kəmiyyət; **small /large /considerable / trifling ~** kiçik / böyük / xeyli / cüzi miqdar; **in ~** miqdarca, sayca, kəmiyyətcə; **the ~ of clouds** buludluluq balı / dərəcəsi; **the ~ used** *tex. (bir şeyin)* sərf edilmə dərəcəsi; *They have many amount of money Onların xeyli miqdarda pulu var;* **2.** ümumi məbləğ, yekun; *What is the amount of the debt? Borcun ümumi məbləği nə qədərdir?; A large amount of money is spent on tobacco every year Hər il tütünə böyük məbləğdə pul xərclənir;* **3.** *müh.* ümumi məbləğ və onun faizi

**amount**[2] [ə'maunt] *v* **1.** məbləğ təşkil etmək; -a, -ə çatmaq; *The bill amounts to £ 25 Hesab 25 funtdan ibarətdir;* **2.** eyni qüvvəyə/eyni mənaya bərabər olmaq, bərabər olmaq; **to ~ to a refusal/threat** imtinaya/hədəyə bərabər olmaq; **to ~ to very little, not to ~ to much** böyük mənası olmamaq, az əhəmiyyətə malik olmaq; *What does it amount to? Bu nə deməkdir?*

**amour** [ə'muə'] *n* **1.** gizli məhəbbət əlaqəsi; **2.** məhəbbət əlaqəsində olan adam *(xüsusən qadın)*; **3.** *arx.* sevgi, məhəbbət, eşq; mehribanlıq, istiqanlılıq; incə hərarətli hiss / duyğu

**amove** [ə'mu:v] *v* **1.** *hüq.* azad etmək, kənar etmək, çıxarmaq *(işdən, vəzifədən);* **2.** *arx.* həyəcanlandırmaq; oyatmaq, oyandırmaq, hərəkətə gətirmək

**amperage** [æm'peərıdʒ] *n el.* cərəyanın gücü *(amperlə)*

**amp** [æmp] *n* = **ampere**

**ampere** ['æmpeə'] *n el.* amper

**ampere-hour** [ˌæmpeər'auə'] *n el.* amper-saat

**amperometer** [ˌæmpə'rɔmıtə'] *n el.* ampermetr

**amphibian** [æm'fıbıən] *n* **1.** *zool.* amfibiya *(həm suda, həm də quruda yaşayan heyvan və bitki)*, suda-quruda yaşayan; *Frogs and newts are amphibians Qurbağalar və tritonlar (kərtənkələyəoxşar heyvan) amfibiyadırlar;* **2.** amfibiya *(quruda və suda gedən tank və avtomobil; suda və quruda enib qalxa bilən təyyarə)*

**amphibious** [æm'fıbıəs] *adj* suda və quruda yaşayan / yaşaya bilən *(heyvan və bitki haq.)*; suda və quruda hərəkət edən / edə bilən *(nəqliyyat haq.); Frog is an amphibious animal Qurbağa suda və quruda yaşaya bilən heyvandır*

**amphibolic** [ˌæmfı'bɔlık] *adj* **1.** *d.d.* ikimənalı, eyhamlı, kinayəli; **2.** *min.* amfibiya xüsusiyyətinə malik; **3.** *tib.* şübhəli, aydın olmayan, dəyişən, enib-qalxan, qərarsız

**amphilogy** [æm'fılədʒı] *n d.d.* ikimənalılıq

**amphora** ['æmfərə] *n (pl* **-rae)** **1.** amfora *(qədim yunanlarda: içki və s. saxlamaq üçün ikiqulplu, boğazı dar gil qab);* **2.** maye ölçüsü

**amphorae** ['æmfəri:] *n* **amfora** *isminin cəm forması*

**amphoral** ['æmfərəl] *adj* amforabənzər, amforaoxşar

**ample** ['æmpl] *adj* **1.** tam kifayət; bol; bolluca; zəngin; çox; **~ resources** bol/zəngin mənbə /ehtiyat/vəsait mənbəyi; **~ supply of bread /of water** bol çörək / su ehtiyatı; **~ opportunities** geniş imkanlar; **~ room for** ***smth.*** bir şey üçün çox / bol yer; *$ 100 will be ample for my needs Mənim ehtiyaclarım üçün 100 $ tamam kifayət edər; They have ample time Onların kifayət qədər vaxtı var;* **to make ~ promises** bolluca/çox vəd vermək; **2.** geniş, hüdudsuz, tutumlu, həcmli; **an ~ room/ house** geniş otaq /ev; **~ territories** geniş/hüdudsuz ərazi; **3.** geniş, ətraflı, müfəssəl; **~ description** geniş/ətraflı / müfəssəl təsvir

**ampliation** [ˌæmplı'eıʃn] *n d.d.* **1.** artırma, artma, çoxalma, çoxaldılma, böyümə, böyütmə; böyüdülmə, genişləndirmə; qüvvətləndirmə; **2.** *hüq.* əlavə istintaqa ehtiyacla əlaqədar olaraq işi təxirə salma

**amplification** [ˌæmplıfı'keıʃn] *n* **1.** artırma, genişləndirmə; yayma, yayılma, intişar; *The matter requires amplification Məsələ işi dərindən öyrənməyi tələb edir;* **2.** inkişaf *(fikir, təklif);* genişlənmə; **the ~ of the predicate** xəbərin ge-

nişləndirilməsi; 3. *radio* gücləmə, gücləndirilmə; 4. böyütmə *(optik cihaz haq.)*
**amplifier** ['æmplıfaıə^r] *n el. radio* qüvvətləndirici; **tube** ~ *radio* lampalı qüvvətləndirici / radio
**amplify** ['æmplıfaı] *v (pt, pp* **-ied***)* 1. böyütmək, artırmaq, genişləndirmək; gücləndirmək; 2. inkişaf etdirmək *(fikri və s.)*; ətraflı / hərtərəfli təsvir etmək; *Could you amplify your statement? Fikrini/ Fikrinizi bir qədər ətraflı izah edə bilərsənmi/bilərsinizmi?*; 3. qüvvətləndirmək *(radio və s.)*
**amplitude** ['æmplıtju:d] *n* 1. genişlik; böyüklük; böyük tutum; 2. fikrin / baxışın genişliyi; vüsət; 3. hərəkətin mənzili; hərəkətin radiusu
**amply** ['æmplı] *adv* 1. kifayət qədər; bol, bol-bol, bolluca, çoxluca; 2. geniş, geniş surətdə / tərzdə; *We are amply supplied with water Biz su ilə kifayət qədər təmin olunmuşuq;* 3. müfəssəl, müfəssəl surətdə /tərzdə, təfərrüatı ilə, təfsilatı ilə
**ampoule** ['æmpu:l] *n tib.* ampula *(dərman saxlanılan qapalı kiçik şüşə qab)*
**ampule** ['æmpju:l] *n* = **ampoule**
**amputate** [''æmpjuteıt] *v* 1. *tib.* amputasiya etmək, kəsmək *(bədən üzvünü)*; 2. kəsmək, kəsib atmaq, budamaq *(ağacı və s.)*
**amputation** [ˌæmpju'teıʃn] *n* 1. *tib.* amputasiya *(bədən üzvünün kəsilməsi)*; 2. budama *(ağacı)*; 3. çıxartma *(sözü, cümləni nitqdən)*
**amputator** ['æmpjuteıtə^r] *n* amputasiya edən
**amputee** [ˌæmpju'ti:] *n* ayağı və ya əli kəsilən şəxs / adam
**amrita**[1] [ʌm'ri:tə] *n əs.* ambrosiya *(allahlara daimi cavanlıq və həyat verən ətirli yemək)*
**amrita**[2] [ʌm'ri:tə] *adj şair* ölməz, ilahi, əbədi
**amulet** ['æmjulıt] *n* həmayil, dua, gözmuncuğu, tilsim
**amuse** [ə'mju:z] *v* 1. əyləndirmək; güldürmək, məşğul etmək; **to ~ *smb.* with jokes** bir kəsi zarafatla əyləndirmək; **to ~ *smb.* by doing *smth.*** bir şey etməklə bir kəsi əyləndirmək; *Your jokes amused me Sənin / Sizin zarafatların / zarafatlarınız məni əyləndirdi; I was secretly amused by his threats Onun hədələrinə mən ürəyimdə güldüm;* **to keep *smb.* ~d** bir kəsi əyləndirmək /məşğul etmək; 2. vaxt keçirmək *(yaxşı mənada)*, əylənmək; **to ~ *one's* leisure** vaxtını yaxşı keçirmək; **to ~ oneself with *smth.*** bir şeylə əylənmək; *The new toys amused the child for hours Yeni oyuncaq uşağı saatlarla əyləndirdi;* 3. *arx.* yayındırmaq, ayırmaq, sapdırmaq, azdırmaq *(aldatmaq məqsədilə)*; 4. *arx.* çətin vəziyyətə salmaq, çətin vəziyyətdə qoymaq, karıxdırmaq, çaşdırmaq
**amused** [ə'mju:zd] *adj* razı, məmnun, xoşhal; ~ **spectators** razı / məmnun / xoşhal tamaşaçılar; ~ **look** məmnun / razı baxış
**amusement** [ə'mju:zmənt] *n* 1. əyləncə; əyləndirmə; şənlik, tamaşa, əylənmə; **plenty of ~s plays, moving pictures, football matches, and *so on*** çoxlu əyləncələr teatr, kino, futbol yarışları və *s.*; **fashionable ~s** dəbdə olan əyləncələr; 2. zövq, ləzzət; kef, səfa; **to drive much ~ in reading** oxumaqdan çox ləzzət / zövq almaq; **to do *smth.* for *one's* own ~** öz kefi üçün bir şey etmək; **idle ~** boş / məqsədsiz vaxt keçirmə; **favourite/ chief ~** sevimli/əsas məşğuliyyət; **to seek time-killing ~** vaxt öldürmək üçün əyləncə axtarmaq; 3. şənlik, nəşə, şadlıq; sevinc; **unconcealed ~** açıq sevinc/nəşə /şadlıq; **to cause/to provoke great ~** ümumi sevinc/şənlik yaratmaq, güldürmək, məşğul etmək; 4. *arx.* diqqəti yayındırma *(aldatmaq məqsədilə)*; 5. *arx.* fikirləşmə, düşünmə, fikrə dalma, fikirlilik, dalğınlıq
**amuser** [ə'mju:zə^r] *n* məzəli adam, zarafatçı, masqaraçı
**amusing** [ə'mju:zıŋ] *adj* məzəli, gülməli; əyləndirici; **an ~ story** məzəli əhvalat / hekayə; qəribə, zarafatçı, hənəkçi
**amusingly** [ə'mju:zıŋlı] *adv* gülməli; məzəli, qəribə; gülməli tərzdə / şəkildə
**amylum** ['æmıləm] *n* nişasta, kraxmal
**an** *tam forması* [æn]; *reduksiya olunmuş formaları* [ən, n]; *qeyri-müəyyənlik artiklinin saitlə başlanan sözlərin qarşısında işlənən forması* **an** elephant, **an** hour
**-an** [-æn]*(həm də* **-ian, ean***) nisbi sifətləri düzəltmək üçün şəkilçi*: African Afrika; **African** languages Afrika dilləri; Crimean Krım; **Crimean** climate Krımın iqlimi; Iranian İran; **Iranian** newspapers İran qəzetləri
**anaconda** [ˌænə'kɔndə] *n zool.* anakonda *(boa fəsiləsindən olan ən iri ilan)*
**anaesthesia** [ˌænıs'θi:zjə] *n tib.* anesteziya, keyləşmə, keyləşdirmə
**anaesthetic**[1] [ˌænıs'θetık] *n tib.* keyləşdirici/ anesteziyaedici maddə; **a local ~** yerli keyləşdirmə *(müəyyən sahəni)*
**anaesthetic**[2] [ˌænıs'θetık] *adj* anesteziyaedici, keyləşdirici
**anaesthetist** [æ'ni:sθıtıst] *n tib.* anestezioloq, narkotizator; narkoz verən, narkotizasiya edən adam
**anaesthetize** [æ'ni:sθıtaız] *v* keyləşdirmək, hissizləşdirmək
**analog** ['ænəlɔg] *n* bənzərlik, oxşarlıq, analoq
**analogical** [ˌænə'lɔdʒıkəl] *adj* 1. analoji, analogiyaya əsaslanan; ~ **languages** analoji dillər; 2. *arx.* məcazi, metanomik
**analogism** [ə'nælədʒızm] *n* analogizm
**analogist** [ə'nælədʒıst] *n* analogist *(analogiyadan istifadə edən adam)*
**analogize** [ə'nælədʒaız] *v* 1. analogiyaya əsaslanaraq izah etmək, analogiyadan istifadə etmək, bir şey haqqında analogiyaya əsasən mühakimə yürütmək / fikir söyləmək; 2. *arx.* müvafiq gəlmək, uyğun olmaq



**analogous** [ə'næləgəs] *adj* oxşar, oxşayan, bənzər, bənzəyən; **relatively ~** nisbi oxşar / bənzər; **strikingly/approximately ~** son dərəcə /təxmini oxşar; ~ **poles** *el.* biradlı qütblər
**analogy** [ə'nælədʒı] *n* 1. analogiya, oxşayış, bənzəyiş, bənzətmə, oxşarlıq, bənzərlik, eynilik; ~ **between organs** üzvlər arasında oxşarlıq /bənzərlik /eynilik; ~ **to / with *smth.*** bir şeyə oxşar / bənzər; **to reason from ~** analogiyaya / oxşarlığa/bənzərliyə / eyniliyə əsaslanaraq nəticə çıxarmaq; **to bear ~ to *smth.*** bir şeylə oxşar olmaq, bir şeyə bənzəyişi/oxşarlığı olmaq, bir şeyə bənzəmək/oxşamaq; **on the ~ of *smth.*, by ~ with *smth.*** bir şeylə analogiyaya/oxşarlığa /bənzərliyə görə; *The teacher drew an analogy between the human heart and a pump Müəllim insan ürəyi ilə nasos arasında analogiya olduğunu dedi;* 2. *cəb.* nisbətlərin bərabərliyi
**analysable** ['ænəlaızəbl] *adj* analiz edilə bilən, təhlil oluna /edilə bilən, təhlilə yatan
**analyse** ['ænəlaız] *v* 1. təhlil / analiz etmək, təhlil / analiz aparmaq; **to ~ carefully / profoundly / chemically / scientifically** diqqətlə / dərindən /kimyəvi baxımdan/elmi baxımdan təhlil etmək; **to ~ legally / financially** hüquqi cəhətdən /maliyyə baxımından ətraflı təhlil etmək; **to ~ logically** məntiq baxımından / məntiqi cəhətdən təhlil etmək; *If we analyse water, we find that it is made up of two parts of hydrogen and one part of oxygen Əgər biz suyu təhlil etsək məlum olar ki, o, iki hissə hidrogendən və bir hissə oksigendən ibarətdir;* 2. *qram.* təhlil etmək *(cümləni)*; *Let's analyse this sentence Gəlin bu cümləni təhlil edək*; 3. *kim.* hissələrinə ayırmaq
**analyser** ['ænəlaızə^r] *n* analizator *(elektrik priboru)*; tester
**analyses** [ə'næləsi:z] *n* **analysis** *isminin cəm forması*
**analysis** [ə'næləsıs] *n (pl* **-ses***)* 1. analiz, təhlil; araşdırma, öyrənmə, tədqiq etmə, tədqiq; 2. *qram.* təhlil; **sentence ~** sintaktik təhlil; 3. psixoanaliz *(idealist cərəyan)*; **under ~** psixoanalizə məruz qalan; 4. analitik metod, təhlil, analiz; **spectral ~** spektral təhlil /analiz; 5. differensial və inteqral hesablama;
◊ **in the last ~** axır nəticədə, nəhayətdə
**analyst** ['ænəlıst] *n* 1. analitik *(analizlərlə məşğul olan mütəxəssis)*; 2. psixoanaliz üzrə mütəxəssis, psixoanaliz metodundan istifadə edən psixiatr *(ruhi xəstələr həkimi)*; 3. *amer.* analitik, kommentator, şərhçi, **diplomatic ~** xarici siyasət üzrə kommentator / şərhçi
**analytical** [ˌænə'lıtıkəl] *adj* analitik; ~ **languages** analitik dillər; *She has a very analytical mind Onun çox yaxşı analitik təfəkkürü / ağlı var*
**analytics** [ˌænə'lıtıks] *n* 1. analiz məharəti / ustalığı; 2. məntiqin analiz qanunlarını öyrənən bölməsi; analitika; 3. *arx.* analitik həndəsə
**analyze** ['ænəlaız] *v* = **analyse**
**ananas** [ə'na:nəs] *n bot.* ananas
**anaplasty** ['ænəplæstı] *n tib.* plastik cərrahiyyə
**anarch**[1] ['æna:k] *n şair.* rəhbər, başçı, qiyamın başçısı
**anarch**[2] ['æna:k] *adj* anarxist; dövləti olmayan
**anarchism** ['ænəkızm] *n* anarxizm; *(hər cür dövlət hakimiyyətini inkar edən siyasi cərəyan; başlı-başınalıq, hərc-mərclik)*
**anarchist** ['ænəkıst] *n* anarxist
**anarchy** ['ænəkı] *n* anarxiya
**anatomy** [ə'nætəmı] *n* 1. yarma *(meyiti)*; 2. anatomiya; **Animal/Human Anatomy** heyvan /insan anatomiyası; 3. *arx.* skelet; mumiya; 4. quruluş; 5. ətraflı / hərtərəfli təhlil
**ancestor** ['ænsıstə^r] *n* 1. ulu baba, cədd; **remote ~s** uzaq ulu babalar, ata-baba, əcdad; 2. *hüq.* əvvəlki sahib
**ancestral** [æn'sestrəl] *adj* irsi; ata-baba, soy; ~ **estates** dədə-baba mülkləri; ~ **forms of life** ata-babalardan miras qalmış həyat tərzi; ~ **feature** *biol.* irsi əlamət / nişanə; ~ **property** *hüq.* ata-babadan qalma əmlak / mülk
**ancestress** ['ænsıstrıs] *n* böyük ana, ulu nənə
**ancestry** ['ænsıstrı] *n* 1. nəsil; əsil, mənşə; şəcərə, nəsil şəcərəsi, nəsil tarixi; 2. ata-baba, ulu baba
**anchor**[1] ['æŋkə^r] *n* 1. *dən.* lövbər, ləngər; **sea ~** üzən lövbər/ləngər; **to be at ~** lövbərdə olmaq; **to lie / to ride at ~** lövbərdə dayanmaq; **to cast / to drop ~** lövbər / ləngər salmaq; **to come to (an) ~** lövbərdə dayanmaq, lövbər salmaq; **to ride at single ~** 1) bir lövbərdə/ləngərdə dayanmaq; 2) *məc.* ehtiyatsızlıq etmək; **to weigh / to raise ~** 1) lövbəri / ləngəri qaldırmaq; 2) dənizə çıxmaq; 3) *məc.* dayandırılmış işi davam etdirmək; **to drag the ~** *dən.* dreyf etmək *(1) küləyin və ya su axınının təsiri ilə yolundan kənara çıxmaq; 2) axınla üzmək; 3) dreyflə yatmaq)*; 2. xilas lövbəri, xilas rəmzi; 3. *tex.* anker *(dəmir bənd və ya bolt)*
**anchor**[2] ['æŋkə^r] *adj* lövbər, ləngər; ~ **cable** lövbər/ləngər zənciri; ~ **bolt** lövbər/ləngər boltu; ~ **hold** lövbər dayanacağı; ~ **ground** lövbər / ləngər yeri;
◊ **to lay / to cast/to have an ~ to windward** ehtiyat tədbiri görmək
**anchor**[3] ['æŋkə^r] *v* lövbərdə dayandırmaq; **to ~ a ship** gəmini lövbərə qoymaq, gəmini dayandırmaq; **to be ~ed** lövbərdə olmaq, limanda dayanmaq;
◊ **to ~ *one's* hopes** ümid olmaq / bağlamaq, ümid bəsləmək
**anchorage** ['æŋkərıdʒ] *n* lövbərdə dayanmaq üçün yer / dayanacaq
**anchorage-ground** ['æŋkərıdʒ'graund] *n* dayaq; dirək, söykənəcək

**anchoress** ['æŋkərıs] *n* 1. *d.d.* münzəvi, zahid, tərki-dünya qadın/qız; 2. adamayovuşmaz qadın/qız, adamdanqaçan qadın / qız

**anchoret** ['æŋkərət] *n* 1. rahib, münzəvi; zahid; 2. adamayovuşmaz, adamdanqaçan

**anchorless** ['æŋkəlıs] *adj* 1. lövbərsiz, ləngərsiz; 2. *məc.* axınla üzən, axın istiqamətində üzən

**anchor-ring** ['æŋkərıŋ] *n* lövbər / ləngər halqası

**anchor-shackle** ['æŋkə.ʃækl] *n* lövbər / ləngər çəmbəri, lövbər pərçimi, lövbərin dəmir bəndi

**anchor-stock** ['æŋkəstɔk] *n* lövbər qolu

**anchor-tow** ['æŋkətou] *n* lövbər zənciri

**anchor-watch** ['æŋkəwɔtʃ] *n* lövbər dayanacağında növbə çəkən *(gəmi)*

**anchovy** ['æntʃəvı] *n zool.* ançous *(siyənəyəoxşar xırda çox dadlı balıq)*, xəmsə balığı

**anchusa** [æŋ'kju:sə] *n bot.* qızartı otu

**anciency** ['eınʃənsı] *n d.d.* qədimlik; köhnəlik; qədim zaman

**ancient**[1] ['eınʃənt] *n* 1. qədimdə yaşamış yunanıstanlı, misirli və ya romalı adam; 2. qoca kişi, ağsaqqal;
◊ **the Ancient of Days** *din.* əbədi, əzəli *(ilahiyyatda Allaha verilən sifətlərdən biri)*

**ancient**[2] ['eınʃənt] *adj* 1. antik, qədim; ~ **art / literature** antik incəsənət /ədəbiyyat, antik/qədim ədəbiyyat; ~ **languages** antik/ qədim dillər; ~ **authors** antik/qədim müəlliflər; 2. köhnə, qədim; **in ~ time** qədim/köhnə zamanlarda; **an ~ city** qədim şəhər; ~ **customs** qədim / köhnə adətlər; 3. *arx.* əvvəlki; keçən; 4. *arx.* 1) çoxdankı, əldən düşmüş; *I've got a very ancient car Mənim çox köhnə əldən düşmüş bir maşınım var;* 2) hörmətli, dünyagörmüş

**ancients** ['eınʃənts] *n (adət. böyük hərflə yazılır və qarşısında müəyyənlik artikli işlədilir)* qədim mədəni xalqlar, xüsusən yunanlar və romalılar; **to study the writings of the ~** qədim xalqların ədəbiyyatını öyrənmək

**anciently** ['eınʃəntlı] *adv* keçmişdən, keçmiş vaxtlardan, əvvəldən, qədimdən, köhnədən

**ancientness** ['eınʃəntnıs] *n* qədimlik, köhnəlik; qədim zaman, uzaq keçmiş, keçmiş əyyam

**ancienty** ['eınʃəntı] *n hüq.* yaşa / staja / rütbəyə görə böyüklük, ağsaqqallıq

**ancillary** [æn'sılərı] *adj* yardımçı, köməkçi, əlavə; ~ **services** əlavə xidmətlər

**and** [ænd] *conj (qüvvətli forması:* [ənd]; *zəif formaları:* [ən, nd, n]); 1. *Həmcins üzvləri və müstəqil cümlələri bir-birinə bağlamaq üçün işlədilir:* və; *Tom and Nick were at home Tom və Nik evdə idilər; You and I must go Sən / Siz və mən getməliyik; The teacher came and the lesson began Müəllim gəldi və dərs başlandı / başladı;* **bread ~ butter** çörək və yağ; **coffee ~ milk** kofe və süd; *They sang and danced Onlar oxudular və rəqs etdilər; He is a capable leader and a man of principles O, bacarıqlı rəhbər və prinsipial adamdır; The room was nice and cool Otaq gözəl və sərin idi;* 2. *Aşağıdakı hallarda işlənir və Azərbaycan türkcəsinə tərcümə olunmur:* 1) *onluq bildirən rəqəmlərlə təklik bildirən rəqəmlərin arasında:* **four ~ three quarters** dörd tam dörddə üç; 2) *saat bildirən rəqəmlərlə dəqiqə bildirən rəqəmlərin arasında:* **an hour ~ twenty minutes** bir saat iyirmi dəqiqə; 3) *pens və şillinq bildirən rəqəmlərin arasında:* **three ~ ten pence** iki şillinq on pens; 3. *Məsdəri* **to go, to come, to try** *və s. fellərlə birləşdirir. Bu halda bəzən Azərbaycan türkcəsinə tərcümə edilmir. Go and look at it Get və ona bax, Get ona bax; Try and do it Çalış onu et; Mind and bring the book Yaddan çıxarma, kitabı gətir;* 4. *Sadalama məqamında işlədilir: There were apples, pears and plums in the basket Səbətdə alma, armud və gavalı vardı;* 5. *Prosesin davamlılığını bildirir: He talked and talked O danışdı və danışdı, O danışdı, danışdı; O, ara vermədən /hey danışdı;* 6. *Aşağıdakı birləşmələrdə işlədilir:* ~ **so on,** ~ **so forth** və s. və ilaxirə; ~ **then** sonra; ~ **yet,** ~ **still** yenə də; 6. *ziddiyyət ifadə edir:* amma, lakin; *You stay at home and I'll go to the village Sən / Siz evdə qal / qalın, amma / lakin mən kəndə gedəcəyəm;* 7. *d.d. sual cümlələrinin əvvəlində işlənərək:* 1) *təəccüb ifadə edir, Bu halda* **and** *Azərbaycan türkcəsinə* **bəs** *deyə tərcümə edilir: I am a teacher. And you? Mən müəlliməm. Bəs sən/siz?;* 2) *Emfatik birləşmələrdə işlədilir. Bu halda Azərbaycan türkcəsinə* **hər halda, bununla belə, yenə də** *söz birləşmələri vasitəsi ilə tərcümə edilir: And he did come Hər halda / Bununla belə / Yenə də o gəldi*

**andante** [æn'dæntı] *n* andante *(asta çalınan musiqi əsəri)*

**anecdote** ['ænıkdout] *n* anekdot, lətifə, gülməli əhvalat; **witty/amusing /interesting** ~ ağıllı / əyləndirici / maraqlı lətifə

**anecdotic** [.ænek'dɔtık] *adj* gülməli, anekdota oxşayan, qəribə; 2. anekdot / lətifə sevən

**anecdotical** [.ænek'dɔtıkəl] *adj* = **anecdotic**

**anecdotist** ['ænekdoutıst] *n* anekdot/ lətifə söyləyən adam

**anemology** [.ænı'mɔlədʒı] *n* anemologiya *(külək haqqında elm)*

**anemometer** [.ænı'mɔmıtə'] *n* anemometr *(küləyin sürət və qüvvəsini təyin etmək üçün cihaz)*

**an-end** [ə'nend] *adv arx.* 1. nəhayət; 2. sona qədər; arasıkəsilmədən

**anew** [ə'nju:] *adv* 1. yenidən, təzədən, başdan, bir də, bir daha, yenə də; 2. başqa cür, özgə cür; 3. *arx.* bir az bundan qabaq, bu günlərdə

**angel** ['eındʒəl] *n* 1. mələk; 2. *şair.* pəri; mərhəmətli/rəhmdil qadın; **good** ~ rəhmli /mərhəmətli/rəhmdil mələk; ~ **of death** ölüm mələyi, əzrail; **host of ~s** mələklər dəstəsi/yığını;



**fallen** ~ şeytan, iblis; **to have the patience of an** ~ mələk səbrinə malik olmaq; **as pure/ gentle/mild as an** ~ mələk kimi təmiz /zərif /mülayim; 3. *tar.* qədim qızıl ingilis sikkəsi;
◊ **to join the ~s** *amer.* ölmək, cənnətə getmək; **to make the ~s weep** ≅ hətta dağları-daşları da ağlatmaq

**angelet** ['eındʒılıt] *n* mələkcik, mələkciyez *(xüs. uşaqlar haq.)*

**angel-eyes** ['eındʒəlaız] *n* = **angels' eyes**

**angel-fish** ['eındʒəlfıʃ] *n zool.* 1. dəniz pərisi; 2. dəniz çap balığı

**angelic** [æn'dʒelık] *adj* mələk, pəri; ~ **voices** mələk səsləri; **an ~ expression of countenance** mələksimalı, mələk görkəmli

**angelica** [æn'dʒelıkə] *n bot.* angelika, mələkotu

**angelical** [æn'dʒelıkəl] *adj d.d.* = **angelic**

**angelically** [æn'dʒelıkəlı] *adv* mələkcəsinə, mələk kimi, məsumcasına, məsumanə

**angelize** ['eındʒəlaız] *v arx.* mələyə bənzətmək, mələkləşdirmək

**angel-like** ['eındʒəllaık] *adj* mələyəbənzər; mələk kimi, mələyəoxşar

**angels' eyes** ['eındʒəlzaız] *n bot.* dəstərək *(bitki)*

**anger**[1] ['æŋgə'] *n* qəzəb, qeyz, hirs; **controlled/sham/hot** ~ qarşısı alına bilən/süni/ qızğın qəzəb; **in** ~ hirsli/qəzəbli halda;

**anger**[2] ['æŋgə'] *v* hirsləndirmək, qeyzləndirmək, qəzəbləndirmək; **to ~ smb.** bir kəsi qəzəbləndirmək /qeyzləndirmək; **to be ~ed by smth.** bir şeydən qəzəblənmək /qeyzlənmək; **to be speechlessly ~ ed** hirsdən/qəzəbdən/qeyzdən nitqi tutulmaq

**angina** [æŋ'dʒaınə] *n tib.* 1. angina; 2. *tib.* döş anginası

**angle**[1] [æŋgl] *n* 1. bucaq; **acute / right / obtuse** ~ iti / düz / kor bucaq; **solid** ~ *riyaz.* məkani bucaq; ~ **of lag** *fiz.* ləngimə bucağı; ~ **of dip** maqnitin əyilmə bucağı; ~ **of approach** yaxınlaşma bucağı; ~ **of attack** hücum bucağı *(təyyarənin)*; ~ **of climb** *av.* yüksəklik götürmə bucağı; ~ **of dive** *av.* şığıma bucağı; ~ **of glide** *av.* *(tədricən)* enmə bucağı *(təyyarə haq.)*; 2. nöqteyi-nəzər, yanaşma, baxış; **special / legal / humanitarian/odd** ~ ictimai /yuridik /humanist / qeyri-adi baxış/yanaşma *(məsələyə)*; **divergent ~s** müxtəlif nöqteyi-nəzərlər / baxışlar; **~s of approach to smth.** bir şeyə müxtəlif cəhətdən yanaşma; **to look at the question from all ~s** məsələyə bütün cəhətlərdən / nöqteyi-nəzərdən yanaşmaq; 3. günyə; 4. balıq qarmağı; tilov; **to fish with an** ~ qarmaqla / tilovla balıq tutmaq

**angle**[2] [æŋgl] *v* 1. bucaq altında hərəkət etmək; 2. qarmaqla / tilovla balıq tutmaq; **to ~ for trout** tilovla farel tutmaq; 3. əldə etmək, nail olmaq, müvəffəq olmaq *(adət. dolayı yollarla)*; **to ~ for compliments** komplimentə nail olmağa çalışma; *She is angling for compliments O, komplimentə nail olmağa çalışır*

**Anglicanism** ['æŋglıkənızm] *n* 1. anqlisizm *(ingilis dilindən götürülmüş söz və ya ifadə)*; 2. tipik ingilis adəti / ənənəsi

**Anglicist** ['æŋglısıst] *n* anqlisist *(ingilis dili ilə məşğul olan alim)*

**Anglicize** ['æŋglısaız] *v* ingilisləşdirmək *(görünüş, xarakter, danışıq tərzi üzrə)*

**Anglify** ['æŋglıfaı] *v* = **Anglicize**

**Anglistics** [æŋ'glıstıks] *n* anqlistika

**anglo-** ['æŋglou-] *mürəkkəb sözlərin tərkib hissəsi:* **Anglo-**Indian ingilis-hind; **Anglo-**American ingilis-amerikan; **Anglo-**American relations ingilis-amerikan əlaqələri; **Anglo-**American trade ingilis-amerikan ticarəti

**anglomania** ['æŋglou'meınjə] *n* ingilispərəstlik *(özünü hər şeydə ingilisə oxşatma)*

**Anglophil** ['æŋgloufıl] *n arx.* ingilispərəst

**Anglophile** ['æŋgloufaıl] *n* = **Anglophil**

**Anglophob** ['æŋgloufoub] *n arx.* ingilis düşməni, ingilisləri sevməyən adam

**Anglophobia** ['æŋglou'foubjə] *n arx.* ingilisləri sevməmə

**Anglo-Saxon** ['æŋglou'sæksən] *n* 1. *tar.* anqlosaks, əsl ingilis; 2. qədim ingilis dili

**Anglo-Saxondom** ['æŋglou'sæksəndəm] *n top.i* 1. anqlosakslar *(ingilislər və amerikanlar)*; 2. anqlosakson dövləti *(Böyük Britaniya və ABŞ)*

**Anglo-Saxonism** ['æŋglou'sæksənızm] *n* 1. anqlosaksonizm *(söz və ifadələr)*; 2. anqlosakson milli şovinizmi, anqlosakson irqinin üstünlüyü haqqında inam

**Angolan** [æŋ'goulən] *n* anqoliyalı, Anqola sakini, Anqola əhli, Anqolada doğulmuş adam

**Angora**[1] [æŋ'gɔ:rə] *n* 1. Anqora *(zərif yun verən keçi cinsi)*; 2. Anqora keçisinin yunundan toxunmuş parça; 3. Anqora pişiyi

**Angora**[2] [æŋ'gɔ:rə] *adj* Anqora; ~ **goat** *zool.* Anqora keçisi; ~ **cat** Anqora pişiyi; **an ~ rabbit** Anqora ev dovşanı *(yumşaq tüklü)*, narın tüklü ev dovşanı

**angrily** ['æŋgrılı] *adv* hiddətlə, qeyzlə, qəzəblə, acıqla, hirslə

**angry** ['æŋgrı] *adj* (-ier, -iest) 1. hirsli, acıqlı, qeyzli, tündxasiyyət, qəzəbli, hiddətli; acıqlandırılmış, hirsləndirilmiş, əsəbiləşdirilmiş; ~ **voices** acıqlı/qeyzli/ qəzəbli/hirsli səslər; ~ **with smb. at/ about smth.** bir kəsə/şeyə görə hirslənmiş / qəzəblənmiş / qeyzlənmiş; **to be ~** acıqlı/qəzəbli / hirsli olmaq; *I'll be angry if you come late Gec gəlsən/gəlsəniz, mən sənə/sizə acıqlanacam/qəzəblənəcəm:* **to get / to grow ~** hirslənmək, acıqlanmaq, qeyzlənmək, qəzəblənmək; **to make smb. ~** bir kəsi acıqlandırmaq/hirsləndirmək/qəzəbləndirmək/qeyzləndirmək; 2. soyuqlamış, qızarmış *(yara, xora və s. haq.)*; 3. tufanlı *(səma, bulud haq.)*

**anguish** ['æŋgwıʃ] *n* əzab, əziyyət, işgəncə, məşəqqət, ağrı; iztirab, cəfa, möhnət, dərd; ~ **of**

**body and mind** fiziki və mənəvi əzab / əziyyət / iztirab; **to be in ~ at** ***smth.*** bir şeyə görə əzab/əziyyət/dərd /cəfa çəkmək; **to suffer ~** əzab / əziyyət / işgəncə / məşəqqət / iztirab çəkmək; *She was in anguish over her missing child O, itkin düşmüş uşağa görə dərd / əzab / iztirab çəkirdi*

**anguished** [ˈæŋgwɪʃt] *adj* dərdli, kədərli, əzablı, iztirablı, möhnətli, ağrılı; **~ cries** dərdli / kədərli ah-nalə

**angular** [ˈæŋgjuləʳ] *adj* **1.** bucaq, künc; **~ point** bucağın ucu/başı/zirvəsi; **2.** itiuclu; biçimsiz, yöndəmsiz; kələ-kötür, çıxıq-çıxıq, tin-tin; **~ figure** kələ-kötür fiqura; **~ youth** yöndəmsiz /biçimsiz gənc oğlan; **3.** arıq, sısqa, çox arıq, sümükləri çıxmış; **4.** *arx.* deyingən, davakar, cəncəl; bədrəftar, yola getməyən; **5.** *arx.* ifrat dərəcədə ciddi, zabitəli, rəsmiyyətpərəst; **6.** *tex.* dirsəkli

**angularity** [ˌæŋgjuˈlærɪtɪ] *n* **1.** iti bucağın olması; **2.** kələ-kötürlük, tin-tinlik; kobudluq, qabalıq, yöndəmsizlik; qeyri-sabit, dəyişkən; **~ of character** qeyri-sabit/dəyişkən xarakter; **3.** əyrilik/ çəplik bucağı

**angularly** [ˈæŋgjuləlɪ] *adv* **1.** iti bucaq altında; **2.** kobudcasına, yöndəmsiz; rabitəsiz

**angulate** [ˈæŋgjulɪt] *adj* bucaqlı, bucağı olan, künclü; bucaqvarı, bucağa oxşar

**angulometer** [ˌæŋgjuˈlɔmɪtəʳ] *n* xarici bucağı ölçmək üçün cihaz

**anhydrous** [ænˈhaɪdrəs] *adj* *kim.* susuz; **~ alcohol** qatışıqsız spirt, təmiz spirt

**ani** [ˈɑːnɪ] *n* **anus** *isminin cəm forması*

**anility** [æˈnɪlɪtɪ] *n* qocalıq, zəiflik, gücsüzlük, taqətsizlik *(qadın haq.)*

**animal**[1] [ˈænɪməl] *n* heyvan; **domestic ~s** ev heyvanları; **four-footed ~s** dördayaqlı heyvanlar; **herbivorous ~s** otyeyən heyvanlar; **fur-bearing ~s** xəzverən heyvanlar; xəzli heyvanlar; *Snakes, fish and birds are animals İlanlar, balıqlar və quşlar heyvandır*

**animal**[2] [ˈænɪməl] *adj* **1.** heyvan; heyvana aid olan; **the ~ kingdom** heyvanlar aləmi; **~ chemistry** heyvanların biokimyası; **2.** *məc.* heyvani; **~ fear** heyvani qorxu; **3.** heyvandarlıq, heyandarlığa aid; **~ breeder** heyvandar, maldar, maldarlıq / heyvandarlıq mütəxəssisi; **~ farm** heyvandarlıq ferması / təsərrüfatı; **~ husbandary 1)** heyvandarlıq, maldarlıq; **2)** heyvandarlıq / maldarlıq təsərrüfatı; **~ breeding / raising** heyvandarlıq, maldarlıq, heyvanyetişdirmə; mal-qara bəsləmə

**animalism** [ˈænɪməlɪzm] *n* animalizm *(heyvan şəkilləri çəkmə)*

**animalist** [ˈænɪməlɪst] *n* **1.** animalist *(heyvan şəkilləri çəkən rəssam)*; **2.** animalizm nəzəriyyəsinin tərəfdarı

**animate**[1] [ˈænɪmɪt] *adj* **1.** canlı, yaşayan *(heyvan və bitki haq.)*; **~ nature** canlı təbiət; **2.** *məc.* hərəkət edə bilən; *The clock was the only animate thing in the quiet room Sakit otaqda hərəkət edə bilən yeganə şey saat idi;* **3.** qızğın, coşğun, ehtiraslı, həyəcanlı

**animate**[2] [ˈænɪmeɪt] *v* **1.** canlandırmaq; **to ~** ***smb.'s*** **courage** bir kəsin cəsarətini canlandırmaq; *Joy animates her features Sevinc onun çöhrəsini şölələndirdi;* **2.** ruhlandırmaq, ruh vermək; şövqə gətirmək

**animated** [ˈænɪmeɪtɪd] *adj* canlı; qızğın; **~ conversation** qızğın / canlı söhbət;
◊ **~ cartoons** cizgi filmi

**animater** [ˈænɪmeɪtəʳ] *n* **= animator**

**animation** [ænɪˈmeɪʃn] *n* **1.** canlandırma, canlandırılma, canlanma; dirilmə, dirçəlmə; canlılıq; **with ~** canlı, həvəslə; **2.** *kino* cizgi filmi hazırlanması; cansız şəkillərin canlandırılması

**animator** [ˈænɪmeɪtəʳ] *n* cizgi filmi hazırlayan rəssam

**animism** [ˈænɪmɪzm] *n* animizm *(ibtidai insanların hər şeydə ruh olmasına inanması)*

**animist** [ˈænɪmɪst] *n* animizm tərəfdarı olan şəxs

**animistic** [ˈænɪmɪstɪk] *adj* animistik *(animizm tərəfdarı)*

**animosity** [ˌænɪˈmɔsɪtɪ] *n* düşmənçilik, ədavət; **with ~** düşməncəsinə, ədavətlə

**anisated** [ˈænɪseɪtɪd] *adj* cirə ilə qarışdırılmış, cirəli, cirə vurulmuş / qarışdırılmış

**anise** [ˈænɪs] *n* *bot.* cirə

**aniseed** [ˈænɪsiːd] *n* cirə toxumu

**anisette** [ˌænɪˈzet] *n* cirə arağı

**anisic** [əˈnɪsɪk] *adj* cirəli, cirə

**anker** [ˈæŋkəʳ] *n* **1.** anker *(qədim maye ölçüsü=31 l)*; **2.** bir anker maye tutan çəllək

**ankle** [ˈæŋkl] *n* topuq, topuq çıxıntısı

**ankle-joint** [ˈæŋkldʒɔɪnt] *n* baldır oynağı

**anklet** [ˈæŋklɪt] *n* **1.** ayaq biləzyi, ayaq həlqəsi; **2.** gödəkboğaz corab *(topuğa qədər geyilən)*

**ankor** [ˈæŋkəʳ] *n* **= anker**

**annalist** [ˈænəlɪst] *n* salnaməçi, salnaməyazan, tarixçi

**annalistic** [ˌænəˈlɪstɪk] *adj* salnamə

**annals** [ˈænlz] *n pl.* **1.** salnamələr; **2.** tarixi salnamələr; **3.** illik *(dövri elmi nəşr)*

**annex**[1] [æˈneks] *n* **1.** əlavə tikili, sonradan əlavə edilmiş tikili; tikib əlavə etmə, əlavə tikilmə; fligel *(əsas binanın yanında tikilmiş ev və ya əlavə tikili / bina)*; **~ to a hotel** mehmanxananın fligeli; **2.** əlavə, əlavə etmə *(kitaba, sənədə və s.)*; **~ to a treaty/to a convention** müqaviləyə / konvensiyaya əlavə; **3.** *tex.* calaq

**annex**[2] [əˈneks] *v* **1.** birləşdirmək; qatmaq; ilhaq etmək, zorla birləşdirmək, qəsb etmək, zəbt etmək; **to ~ territory** ərazini ilhaq etmək / zorla birləşdirmək / qəsb etmək / zəbt etmək; **2.** əhatə etmək, tərkibinə daxil olmaq; *Districts were annexed by the city Rayonlar şəhərin tərkibinə daxil idi;* **3.** xas / məxsus olmaq; verilmək; **privileges ~ed to royalty** kral ailəsinə verilən imtiyazlar; *Happiness is not always annexed to wealth Dövlət / Zənginlik heç də həmişə xoşbəxtliyə zəmanət vermir;* **4.** təsdiq etmək *(möhür, imza vasitəsilə)*; **5.** əlavə etmək *(sənədə, kitaba və s. ); You will find the list annexed Siyahı əlavə olunur*



**annexation** [ˌænekˈseɪʃn] *n* birləşdirmə, zəbt etmə; anneksiya etmə; **forcible ~** zorla/güclə birləşdirmə/anneksiya/zəbt etmə

**annihilate** [əˈnaɪəleɪt] *v* tamamilə məhv etmək; yox etmək; ləğv etmək, aradan qaldırmaq *(qanunu və s.)*; *The invasion force was annihilated İstilaçı qoşun tamamilə məhv edildi*

**annihilated** [əˈnaɪəleɪtɪd] *adj* məhv / ləğv / yox edilmiş, aradan qaldırılmış

**annihilation** [əˌnaɪəˈleɪʃn] *n* tam ləğv edilmə, tam məhv etmə, məhv etmə/ edilmə, yox edilmə, aradan qaldırılma

**annihilative** [əˈnaɪəleɪtɪv] *adj* məhvedici, qırıcı

**anniversarily** [ˌænɪˈvəːsərɪlɪ] *adv* hər il

**anniversary**[1] [ˌænɪˈvəːsərɪ] *n* **1.** ildönümü; ildönümünü bayram etmə; **the ~ of Shakespeare's birth** Şeksprin anadan olmasının ildönümünü bayram etmə; **a wedding ~** toyun *(toy günündən)* ildönümü; **2.** ildönümü ilə əlaqədar olaraq keçirilən bayram / mərasim

**anniversary**[2] [ˌænɪˈvəːsərɪ] *adj* illik, hər ilki, hər il olan, ildə bir dəfə olan / baş verən; **~ celebrations** hər il keçirilən bayram şənlikləri

**annonce** [əˈnɔns] *n* **= announcement**

**annotate** [ˈænouteɪt] *v* annotasiya yazmaq, qısa izahat vermək

**annotated** [ˈænouteɪtɪd] *adj* **1.** şərh edilmiş, izah edilmiş; **2.** kommentariya ilə təchiz edilmiş, qeyd verilmiş

**annotation** [ˌænouˈteɪʃn] *n* annotasiya *(bir kitab, məqalə və s. haqqında qısa məlumat)*; qeyd, kommentariya

**annotator** [ˈænouteɪtəʳ] *n* **1.** annotator *(annotasiya verən/yazan)*; **2.** kommentator

**announce** [əˈnauns] *v* **1.** elan etmək, bildirmək, bəyan etmək, məlumat vermək, xəbər vermək, bəyanat vermək; **to ~** ***smb.'s*** **arrival /departure /birth / death** bir kəsin gəlməsi/getməsi/doğulması/ölümü haqqında xəbər vermək; *They announced the date of their wedding in the newspaper Onlar toyları barədə qəzetdə elan / məlumat verdilər; The flowers and warm winds announced that spring was here Çiçəklər və mülayim küləklər baharın gəlməsini xəbər verirdi;* **2.** bildirmək, xəbərdar etmək; **to ~** ***smth.*** **by a peal of bells** bir şeyi zəng səsi ilə bildirmək; **3.** *id.* hündür səslə elan etmək; **to ~ the lap-time** hər bir dairədən sonra qaçışın nəticəsini bəyan etmək / elan etmək

**announcement** [əˈnaunsmənt] *n* elan; bildiriş; məlumat

**announcer** [əˈnaunsəʳ] *n* diktor

**annoy** [əˈnɔɪ] *v* ovqatını təlx etmək, qanını qaraltmaq, pərt etmək; təngə gətirmək, cana gətirmək, bezdirmək, zəhlə tökmək; bezar etmək; *These flies are annoying me Bu milçəklər mənim zəhləmi tökür, Məni bezdirir;* **to ~ smb.** bir kəsi bezdirmək; **to ~ smb. to death** bir kəsin lap zəhləsini tökmək, bir kəsi lap cana doydurmaq; *I was annoyed because I missed the bus Mən avtobusa çata bilmədiyim üçün pərt oldum*

**annoyance** [əˈnɔɪəns] *n* **1.** pərtlik, dilxorluq, ovqatıtəlxlik; acıq; pislik; **2.** zəhlətökmə, cana gətirmə, qəmiş olma

**annoyed** [əˈnɔɪd] *adj* narazı, acıqlı, hirsli, qıcıqlandırılmış, hirsləndirilmiş, əsəbiləşdirilmiş; **in an ~ voice** narazı/əsəbi səslə

**annoying** [əˈnɔɪɪŋ] *adj* əsəbiləşdirici, əsəbiləşdirən; zəhlətökən, bezikdirici, usandırıcı:, təngə gətirən; *How annoying! Heyf! Əfsus!*

**annoyingly** [əˈnɔɪŋlɪ] *adv* zəhlətökən/təngə gətirən bir tərzdə, bezikdirici bir surətdə / tərzdə

**annual**[1] [ˈænjuəl] *n* **1.** birillik, birillik bitki; **2.** illik, ildə bir dəfə çıxan *(jurnal, məcmuə və s.)*

**annual**[2] [ˈænjuəl] *adj* illik, hər il olan, ildə bir dəfə olan; birillik; **~ fair** illik/ildə bir dəfə olan yarmarka; **~ income / balance / examination** illik gəlir/balans / imtahan; **his ~ income** onun illik gəliri; **~ crop** *k.t.* birillik bitki

**annually** [ˈænjuəlɪ] *adv* hər il; **to celebrate ~** hər il qeyd etmək / bayram etmək

**annuary** [ˈænjuərɪ] *n* salnamə; illik, ildə bir dəfə çıxan *(məcmuə, jurnal və s.)*

**annul** [əˈnʌl] *v* ləğv etmək; **to ~ a law / a decree** qanunu / dekreti ləğv etmək; **to ~ agreement** müqaviləni ləğv etmək; **to ~ marriage** kəbini ləğv etmək

**annular** [ˈænjuləʳ] *adj* üzüyəbənzər, üzükvarı

**annularly** [ˈænjuləlɪ] *adv* üzükvarı

**annulary**[1] [ˈænjulərɪ] *n* çeçələ barmaq

**annulary**[2] [ænjulərɪ] *adj* çeçələ; adsız *(barmaq haq.)*

**annulment** [əˈnʌlmənt] *n* ləğv etmə, ləğv edilmə; aradan qaldırma / qaldırılma

**anode** [ˈænoud] *n* *fiz.* anod *(elektrikdə müsbət elektrod)*

**anodic** [æˈnɔdɪk] *adj* anod

**anomalism** [əˈnɔməlɪzm] *n* anomaliya, anomalizm

**anomalist** [əˈnɔməlɪst] *n* *dilç.* anomalist

**anomalistic** [əˌnɔməˈlɪstɪk] *adj* **1.** anomaliya, qeyri-adi; **2.** *dilç.* anomalistik

**anomalistical** [əˈnɔməlɪstɪkəl] *adj* **= anomalistic**

**anomalous** [əˈnɔmələs] *adj* **1.** qeyri-adi, qeyri-normal, qeyri-düzgün, normada olmayan; **2.** **(to)** *arx.* tən/bərabər olmayan, qeyri-sabit; müvafiq gəlməyən, bir araya sığmayan, uyuşmaz

**anomaly** [əˈnɔməlɪ] *n* **1.** anomaliya, normadan kənara çıxma; *A cat with no tail is an anomaly Quyruqsuz doğulmuş pişik anomaliyadır;* düzgün/doğru olmama; **2.** ardıcıl olmama, məntiqsizlik *(davranışda, xasiyyətdə)*; paradoksallıq

**anonym** ['ænənım] *n* **1.** anonim *(müəllifinin adı bəlli olmayan əsər/yazı)*; **2.** təxəllüs

**anonymity** [.ænə'nımıtı] *n* anonimlik, müəllifinin adının bilinməməsi *(kitab və s. haq)*

**anonymous** [ə'nɔnıməs] *adj* anonim, imzasız; ~ **letters** anonim / imzasız məktublar; **to receive ~ letters** anonim/imzasız məktublar almaq

**anopheles** [ə'nɔfıli:z] *n* anofeles *(malyariya ağcaqanadı)*

**anorak** ['a:nəra:k] *n* anorak *(başlığı/papağı olan isti gödəkcə)*

**anorexia** [.ænə'reksıə] *n tib.* iştahası olmama

**anorexy** ['ænə.reksı] *n* = **anorexia**

**anorganic** [.ænɔ:'gænık] *adj* qeyri-üzvi, cansız

**another** [ə'nʌðə<sup>r</sup>] *pron* **1.** başqa, başqa bir; özgə; *That is quite another matter Bu tamamilə başqa məsələdir; We can do it another time Biz bunu başqa bir vaxt edərik; I don't like this, give me another book Mən bunu xoşlamıram, mənə başqa bir kitab ver/verin;* **2.** bu kimi, oxşar; bənzər, belə, bu cür; *There is not such another man Bunun kimi / Buna oxşar / Buna bənzər adam yoxdur;*

◊ ~ **place** o biri palata *(icmalar palatasının lordlar palatası və əksinə lordlar palatasının icmalar palatası haqqında işlətdiyi ifadə)*

**anourous** [ə'nurəs] *adj zool.* quyruqsuz

**answer**[1] ['a:nsə<sup>r</sup>] *n* **1.** cavab; **to give an ~** cavab vermək; **to have/to receive / to get an ~** cavab almaq/əldə etmək; **in ~ to** *smth.* bir şeyə cavab olaraq; **favourable / ready/evasive ~** müsbət/hazır/ikibaşlı cavab; **an ~ in the affirmative/in the negative** təsdiq / inkar cavab; **to find the ~ to** *smth.* bir şeyə cavab tapmaq; **2.** *riyaz.* həlli, cavabı *(tapşırığın)*; *The answer to 4x2 is 8 4x2 bərabərdir 8-ə, 2x4-ün cavabı 8-dir;*

◊ *She knows all the answers O çox hazırcavabdır, O, söz altında qalan deyil; A soft answer turns away wrath Yumşaq cavab nifrəti yox edir*

**answer**[2] [a:nsə<sup>r</sup>] *v* **1.** cavab vermək; **to ~ the question/letter** suala/məktuba cavab vermək; **to ~** *smb.* bir kəsə cavab vermək; *Have you answered his letter? Sən/Siz onun məktubuna cavab vermisənmi?/vermisinizmi?* **to ~ instantly /frankly /ironically** dərhal / açıq / kinayə ilə cavab vermək; **to ~ a call 1)** haraya/çağırışa cavab vermək; **2)** telefona cavab vermək; **to ~ blows with blows** zərbəyə zərbə ilə cavab vermək; **2.** müvafiq olmaq /gəlmək; doğrultmaq; **to ~ to the purpose** məqsədə müvafiq olmaq, məqsədə cavab vermək; **to ~ hopes** ümidi doğrultmaq; **3.** müyəssər olmaq, müvəffəq olmaq, baş tutmaq; *The plan/The experiment has not answered Plan/Təcrübə baş tutmadı;* **4.** yerinə yetirmək; **to ~ orders / demands** sifarişləri / tələbləri yerinə yetirmək; **5.** təmin etmək; **to ~ claims** şikayəti təmin etmək; **6.** cavab vermək, zamin olmaq / durmaq, məsuliyyət daşımaq; **to ~ for** *smb.* bir kəsə zamin olmaq; **to ~ for** *smb.'s* **honesty** bir kəsin düzlüyünə / sədaqətinə / səmimiyyətinə zamin durmaq / olmaq; **to ~ for** *one's* **wrongdoings** özünün pis əməlləri üçün məsuliyyət daşımaq; **to ~ back** qabarmaq, söz /cavab qaytarmaq, qaba cavab vermək, ədəbsizlik göstərmək; *Don't answer back! Söz qaytarma! /qaytarmayın!, Ədəbsizlik etmə/etməyin!*

**answerable** ['a:nsərəbl] *adj* **1.** məsuliyyətli, məsuliyyət daşıyan; cavabdeh; **to be ~ to** *smb.* **for** *smth.* bir kəs qarşısında bir şey üçün məsuliyyət daşımaq; *I am answerable to the government Mən dövlət qarşısında cavabdehəm/məsuliyyət daşıyıram;* **2.** cavab verilə / cavablandırıla biləcək, etiraz edilə bilən; *Her arguments are not answerable Onun arqumentlərinə qətiyyən etiraz etmək olmaz;* **3.** *d.d.* ümidi doğruldan, müvafiq gələn/gələ biləcək; *The results were not answerable to the hopes Nəticələr ümidi doğrultmadı*

**answerableness** ['ansərəblnıs] *n* cavabdehlik, məsuliyyət daşıma

**answerer** ['a:nsərə<sup>r</sup>] *n* cavabdeh, cavabdeh olan *(adam)*

**ant** [ænt] *n* qarışqa

**an't** [a:nt] = **are not, am not**

**ant**[1]**-** [ənt-] *suff. Əsasən feldən isim düzəltmək üçün işlədilir; bu qisimdən olan isimlər iş görən şəxsi bildirir:* **servant** qulluqçu; **assistant** köməkçi, assistent *və s.*

**ant**[2]**-** [ənt] *suff. Bir qayda olaraq feldən sifət düzəltmək üçün işlədilir:* **observant** diqqətli, gözüaçıq, hər şeyə diqqət yetirən

**antagonism** [æn'tægənızm] *n* **1.** antaqonizm; düşmənçilik, ədavət; **great/sharp /obstinate ~** dərin/kəskin/qatı düşmənçilik; **to be in ~ with** *smb.* bir kəslə düşmənçilik münasibətində olmaq; **~ to/ against** *smb.* bir kəsə düşmənçilik/antaqonist münasibət; **2.** antaqonist ziddiyyət; **to come into ~ with** *smb.* bir kəslə antaqonist münasibətdə olmaq; **the ~ between two men** iki adam arasında düşmənçilik

**antagonist** [æn'tægənıst] *n* antaqonist *(rəqib, barışmaz düşmən)*

**antagonistic** [æn.tægə'nıstık] *adj* antaqonist, bir-birinə zidd, qəti əleyhinə olan; *He is antagonistic to the proposal O, təklifin qəti əleyhinədir*

**antagonistical** [æn.tægə'nıstıkəl] *adj* = **antagonistic**

**antagonistically** [æn.tægə'nıstıkəlı] *adv* düşməncəsinə, ədavətlə, antaqonist bir tərzdə

**antagonize** [æn'tægənaız] *v* düşmənçilik / antaqonizm yaratmaq, düşmənçilik törətmək; *I advise you not to antagonize him Mən sənə/sizə məsləhət görürəm ki, onunla düşmənçilik etməyəsən/etməyəsiniz*

**antalgic** [æn'tældʒık] *adj* ağrıkəsən; **~ medicine** ağrıkəsən dərman



**Antarctic** [ænt'a:ktık] *n*: **the ~** Antarktika *(yer kürəsinin ən soyuq cənub qütb sahəsi)*

**antarctic** [ænt'a:ktık] *adj* antarktik; **Antarctic pole** cənub qütbü

**ant-bear** [ænt'beə<sup>r</sup>] *n zool.* qarışqayeyən *(tropik Amerikada yaşayan və başlıca olaraq qarışqa ilə qidalanan məməli heyvan)*

**ante** ['æntı] *n* ortaya qoyulan pul, banka atılan pul *(qumar oyununda)*

**ante-** ['æntı-] *prea mürəkkəb sifət və ya isimlərin komponenti. Bu qəbildən olan sözlər zaman və ya məkanca qabaqlamanı bildirir. məs.* **antedate** sonradan yazılmış tarix *(xüs. məktubda)*, **ante-bellum** müharibədən əvvəlki, müharibədən qabaqkı

**ant-eater** ['ænt.i:tə<sup>r</sup>] *n* = **ant-bear**

**ante-bellum** ['æntı'beləm] *adj* **1.** müharibədən əvvəlki / qabaqkı; **2.** *amer.* ABŞ-da Vətəndaş müharibəsindən əvvəl

**antecedence** [.æntı'si:dəns] *n* əvvəldən gəlmə, qabaqlama, birincilik, ilkinlik

**antecedent**[1] [.æntı'si:dənt] *n* **1.** qabaq, əvvəl; **2.** *pl* keçmiş həyat, keçmiş vaxtlar; **his ~s** onun tərcümeyi-halı, onun keçmişi; **3.** *qram.* təyin olunan; **4.** əvvəl/ yuxarıda deyilən; əvvəl/yuxarıda göstərilən

**antecedent**[2] [.æntı'si:dənt] *adj* **1.** əvvəlki, qabaqkı, keçən; **2.** aprior, təcrübədən asılı olmayan, təcrübədən qabaq mövcud olan

**antecedently** [.æntı'si:dəntlı] *adv* **1.** qabaqca, əvvəlcə; keçmişdə, qabaqlar, əvvəllər; **2.** aprior, təcrübədən asılı olmayaraq

**antecessor** [.æntı'sesə<sup>r</sup>] *n* sələf

**antechamber** ['æntı.tʃeımbə<sup>r</sup>] *n* vestibül, dəhliz

**antedate**[1] ['æntı'deıt] *n* əvvəlki tarixlə yazılmış, əvvəlki tarix qoyulmuş *(məktub və s.)*

**antedate**[2] ['æntı'deıt] *v* **1.** əvvəlki tarixi yazmaq/ qoymaq; **to ~ a letter** məktuba əvvəlki tarixi qoymaq; **2.** qabaqca olmaq, əvvəl gəlmək, qabaq olmaq; *This old carriage antedates the invention of the car Bu kareta maşın ixtira olunmamışdan qabaq yaranıb;* **3.** qabaqcadan düşünmək, hamıdan qabaq duymaq/sezmək /bilmək / ağlına gəlmək; qabaqlamaq

**ant-eggs** ['æntegz] *n pl* qarışqa yumurtaları /sürfələri

**antelope** ['æntıloup] *n zool.* antilop, qəzal

**antemeridian** ['æntımə'rıdıən] *adj* səhər, günortaya qədərki

**ante meridiem** ['æntımı'rıdıəm] *adv (qısa forması* **a.m.)** günortaya qədər

**ante mortem** ['æntı'mɔ:təm] *adj* ölümqabağı; ~ **statement** ölümqabağı şəhadət / ifadə

**antenatal** [.æntı 'neıtl] *adj* ana bətnində, ana bətnində inkişaf; **an ~ clinic** qadın məsləhətxanası

**antenna** [æn'tenə] *n (pl* **-nae, -as** [-əz]*)* **1.** *(pl* **-as)** radio antenna; **coil ~** ramka antenna; **2.** çıxıntılı antenna; **3.** *bot. zool.* buynuz *(böcəklərdə)*, bığcıq *(bitkilərdə, həşəratlarda)*

**antennae** [æn'teni:] *n* **antenna** *isminin cəm forması*

**antennal** [æn'tenəl] *adj* bığcıqlı

**antennary** [æn'tenərı] *adj* = **antennal**

**ante-room** ['æntıru:m] *n* dəhliz, qəbul otağı

**antetype** ['æntıtaıp] *n* prototip *(timsal, ilk nümunə, əsl, orijinal)*

**anthem**[1] ['ænθəm] *n* **1.** himn; **2.** İngiltərənin dövlət himni; **national ~** dövlət himni

**anthem**[2] ['ænθəm] *v arx.* himn oxumaq

**anther** ['ænθə<sup>r</sup>] *n bot.* tozluq *(çiçəyin erkəkciyində olan toz kisəsi)*

**antherless** ['ænθəlıs] *adj bot.* tozcuğu olmayan, tozcuqsuz

**anthesis** [æn'θi:sıs] *n bot.* çiçəkaçma dövrü, çiçəkləmə dövrü

**anthill** ['ænthıl] *n* qarışqa yuvası, qarışqa topası / yığını

**ant-hilock** ['ænt.hılək] *n* = **anthill**

**anthological** [.ænθə'lɔdʒıkəl] *adj* antoloji

**anthologist** [æn'θɔlədʒıst] *n* antologiya tərtib edən

**anthologize** [æn'θɔlədʒaız] *v* **1.** antologiya tərtib etmək; **2.** antologiyaya daxil etmək

**anthology** [æn'θɔlədʒı] *n* antologiya *(müxtəlif müəlliflərin seçilmiş əsərləri (əsasən şerlər məcmuəsi)*

**anthracite** ['ænθrəsaıt] *n* antrasit *(daş kömürün əla növü)*

**anthropoid**[1] ['ænθrəpɔıd] *n* antropoid, insanabənzər meymun

**anthropoid**[2] ['ænθrəpɔıd] *adj* insanabənzər, insanaoxşar

**anthropoidal** [.ænθrə'pɔıdl] *adj* = **anthropoid**[2]

**anthropolite** [æn'θroupəlaıt] *n* antropolit *(insanın daşlaşmış qalığı)*

**anthropolith** [æn'θroupəlıθ] *n* = **anthropolite**

**anthropological** [.ænθrəpə'lɔdʒıkəl] *adj* antropoloji; **an ~ museum** antropoloji muzey

**anthropologically** [.ænθrəpə'lɔdʒıkəlı] *adv* antropoloji baxımdan / cəhətdən

**anthropologist** [.ænθrə'pɔlədʒıst] *n* antropoloq *(antropologiya ilə məşğul olan alim)*

**anthropology** [.ænθrə'pɔlədʒı] *n* antropologiya *(insanın bioloji təbiətindən bəhs edən elm)*

**anthropophagie** [.ænθrə'pɔfəgaı] *n pl* kanniballar, adamyeyənlər, yamyamlar, insan əti yeyən adamlar

**anthropophagic** [.ænθrəpə'fædʒık'] *adj* adam əti yeyən, adamyeyən

**anthropophagism** [.ænθrə'pɔfədʒızm] *n* kannibalizm, vəhşilik, yırtıcılıq; adam əti yemə, yamyamlıq

**anthropophagist** [.ænθrə'pɔfədʒıst] *n* = **anthropophagite**

**anthropophagite** [.ænθrə'pɔfədʒaıt] *n* kannibal, yamyam, adamyeyən

**anthropophagous** [.ænθrə'pɔfəgəs] *adj* adamyeyən, yam-yam

**anthropophagy** [ˌænθrəˈpɔfədʒı] *n* = **anthropophagism**
**anthropophobia** [ˌænθrəpəˈfoubjə] *n* antropofabiya, adam əti yemə; insansevməzlik, insana qarşı kin/nifrət, adama qarşı nifrət
**anthropotomy** [ˌænθrəˈpɔtəmı] *n* antropotomiya, insan anatomiyası
**anti** [ˈæntı] *n d.d.* müxalifətçi, əks fikirli adam
**anti-** [ˈæntı-] *(həm də* **ant-, anth-***) pref* **1.** anti-, əleyhinə. *Bu prefiks vasitəsilə isim və ya sifət düzəldilir. Belə sözlər məfkurədə, dünyabaxışında, fəaliyyətdə olan əksiliyi bildirir:* **anti**biotic antibiotik, **anti**-fascist antifaşist, **anti**-war müharibə əleyhinə; **2.** qarşı; **anti**slavery quldarlığa qarşı; **3.** zidd; **anti**grammatical qrammatikaya zidd; **anti**logical məntiqə zidd
**antiaerial** [ˈæntıˈeərıəl] *adj* zenit, *(hərbi)* hava hücumuna qarşı
**antiager** [ˈæntıˈeıdʒəʳ] *n* qocalmaya qarşı dərman
**antiairborne** [ˈæntıˈeəbɔ:n] *n* hava desantı əleyhinə; ~ **troops** hava desantı əleyhinə qoşunlar
**anti-aircraft**[1] [ˈæntıˈeəkra:ft] *n hərb. top.i* hava hücumuna qarşı istifadə olunan vasitələr
**anti-aircraft**[2] [ˈæntıˈeəkra:ft] *adj* hava hücumuna qarşı; ~ **artillery** zenit topu; ~ **fire** hava hücumuna qarşı atəş; ~ **defence** hava hücumundan müdafiə; ~ **gun** zenit topu; ~ **security** hava hücumundan müdafiə; ~ **missile** idarəolunan reaktiv zenit mərmisi; ~ **gunner** zenit topçusu
**antiar** [ˈæntıə] *n bot.* ançar, ölümağacı *(isti ölkələrdə bitən şirəsi zəhərli ağac)*
**antibiotic** [ˌæntıbaıˈɔtık] *n* antibiotik
**antichrist** [ˈæntıkraıst] *n* **1.** antixrist, dəccal; **2.** laməzhəb, mürtəd *(söyüş)*
**antichristian** [ˈæntıˈkrıstjən] *adj* antixristian, xristianlıq əleyhinə
**anticipant** [ænˈtısıpənt] *adj* gözləyən, intizar çəkən
**anticipate** [ˌænˈtısıpeıt] *v* **1.** gözləmək *(nə baş verəcəyini); Are you anticipating any trouble when the factory opens again? Zavod yenidən açıldıqda bir əngəl olacağını gözləyirsənmi /gözləyirsinizmi?* **2.** duymaq, əvvəlcədən təsəvvür etmək; *I tried to anticipate the kind of questions they were likely to ask me at the interview Mən onların müsahibə zamanı mənə hansı sualları verə biləcəklərini təsəvvür etməyə çalışırdım;* **3.** qabaqlamaq *(bir kəsi bir iş görməkdə);* **to ~ *smb.* in doing *smth.*** bir kəsi bir iş görməkdə qabaqlamaq; **4.** yaxınlaşdırmaq, tezləşdirmək; **to ~ *one's* ruin** özünün məhvini yaxınlaşdırmaq/ tezləşdirmək; **5.** bir işi vaxtından əvvəl görmək; **to ~ payment** vaxtından əvvəl ödəmək; **to ~ *one's* salary /income** maaşını/gəlirini vaxtından əvvəl xərcləmək
**anticipation** [ænˌtısıˈpeıʃn] *n* **1.** gözləmə; intizar; ümid; qabaqcadan görmə, qabağı görmə, gələcəyi görmə; qabaqcadan hiss etmə, ürəyinə damma, duyma; qabaqcadan duyma; qabaqcadan ləzzətini duyma, qabaqcadan həzz alma, xəyalən ləzzət alma; intizar; əndişə, ehtiyat; ~ **of joy/ pleasure** sevincdən/məmnunluqdan əvvəlcədən həzz alma; *We waited at the station in anticipation of her arrival Biz vağzalda onun gəlməsini intizar içərisində gözləyirdik; Thanking you in anticipation Əvvəlcədən təşəkkürümü bildirirəm (məktubun sonluğu);* **2.** *hüq.* hərəkətin vaxtından əvvəl yerinə yetirilməsi; **3.** vaxtından əvvəl / qabaq hücum
**anticipative** [ænˈtısıpeıtıv] *adj* qabaqcadan hiss olunan / hiss edilən; xəbərdar edən
**anticipatory** [ænˈtısıpeıtərı] *adj* **1.** ilkin, ilk, ibtidai, xəbərdar edən, əvvəldən xəbər verən; ~ **actions** ilkin/ilk tədbirlər; **2.** vaxtından əvvəl / qabaq
**anticlerical** [ˈæntıˈklerıkl] *adj* din və ruhanilərə qarşı
**anticlericalism** [ˈæntıˈklerıkəlızm] *n* antiklerikalizm *(din və ruhanilərə qarşı hərəkət)*
**anticlockwise** [ˌæntıˈklɔkwaız] *adj* saat əqrəbinin əksinə
**anticonstitutional**[ˌæntıˈkɔnstıˈtju:ʃənl] *adj* antikonstitusiya, konstitusiya əleyhinə, konstitusiyaya qarşı / zidd
**anticorresive** [ˈæntıkəˈrousıv] *adj* korroziyadan qoruyan / mühafizə edən
**anticyclone** [ˈæntıˈsaıkloun] *n meteor.* antisiklon *(hava kütləsinin əsas etibarilə aşağıya doğru hərəkət etdiyi yüksək təzyiqli sahə)*
**antidazzle** [ˈæntıˈdæzl] *adj* gözü qamaşdırmayan *(fənərlərin işığı haq.)*
**antidemocrat** [ˈæntıˈdeməkræt] *n* antidemokrat *(demokratiya əleyhinə olan adam)*
**antidemocratic** [ˈæntıˌdeməˈkrætık] *adj* antidemokratik, demokratiyaya zidd/qarşı, demokratiya əleyhinə
**antidotal** [ˈæntıˈdoutl] *adj* zəhər əleyhinə, zəhərə qarşı
**antidote** [ˈæntıˈdout] *n* padzəhr, padzəhər
**antielectron** [ˈæntııˈlektrɔn] *n fiz.* antielektron, pozitron
**anti-fascist** [ˈæntıˈfæʃıst] *n* antifaşist, faşizm əleyhinə olan adam
**antifederalist** [ˈæntıˈfedərəlıst] *n amer.* antifederalist, federasiya əleyhinə olan adam
**antifreeze** [ˈæntıˈfri:z] *n* antifriz, donmayan maye qatışığı
**anti-gas** [ˈæntıˈgæs] *adj hərb.* qazdan qoruyucu, zəhərləyici maddələrdən qoruyucu; ~ **cape** qazdan müdafiə üçün çiyinlik /başlıq; ~ **clothing** qazdan müdafiə üçün geyim; ~ **equipment 1)** zəhərləyici maddələrdən müdafiə xidməti üçün avadanlıq; **2)** zəhərləyici maddələrdən müdafiə üçün vasitələr; ~ **intelligence** kimya kəşfiyyatı; ~ **officer** kimya xidmət zabiti
**anti-imperaialistic** [ˈæntıımˌpıərıəˈlıstık] *adj* antiimperialist, imperializmə zidd



**antijamming** [ˈæntıˈdʒæmıŋ] *n rad.* maneəni aradan qaldırma, maneədən müdafiə
**anti-mechanized** [ˈæntıˈmekənaızd] *adj amer. hərb.* tank əleyhinə, tanka qarşı; ~ **defense** tanka qarşı müdafiə; ~ **security** tank əleyhinə müdafiə tədbirləri
**antimilitarism** [ˈæntıˈmılıtərızm] *n* antimilitarizm *(militarizmə qarşı hərəkət)*
**antimilitarist** [ˈæntıˈmılıtərıst] *n* antimilitarist *(militarizm əleyhinə olan adam)*
**antimilitaristic** [ˈæntıˈmılıtərıstık] *adj* antimilitarist, militarizmə zidd / qarşı
**antimonarchical** [ˈæntımɔˈna:kıkəl] *adj* antimonarxist, monarxizm əleyhinə/ziddinə olan
**antimonarchist** [ˈæntıˈmɔnəkıst] *n* antimonarxist, monarxiya düşməni
**antimony** [ˈæntımənı] *n kim.* **1.** antimon *(kimyəvi element)*; **2.** sürmə
**antinational** [ˈæntıˈnæʃnəl] *adj* millət əleyhinə, millətə zidd / qarşı
**antinomy** [ænˈtınəmı] *n* **1.** *hüq.* qanunda ziddiyyət, iki qanun arasında ziddiyyət; **2.** antinomiya; ziddiyyət; paradoks
**antipathetic** [ænˌtıpəˈθetık] *adj* qanısoyuq, xoşa gəlməyən, mənfur, nifrət oyadan, çiyrəndirici
**antipathetically** [ænˌtıpəˈθetıkəlı] *adv* nifrət oyadıcı bir tərzdə, xoşa gəlməyən bir surətdə, çiyrəndirici bir tərzdə
**antipathy** [ænˈtıpəθı] *n* antipatiya, xoşa gəlməmə, nifrət
**antipersonnel** [ˈæntıˌpə:səˈnel] *adj hərb.* piyadaya qarşı, piyada qoşunlar əleyhinə; ~ **bomb** qəlpəli bomba; ~ **mine/obstacle** piyada qoşunlara qarşı mina/maneə
**antipodal** [ænˈtıpədl] *adj* **1.** antipod; **2.** tam qarşı qoyulmuş
**antipode** [ˈæntıpoud] *n* antipod *(düşüncə və xaraktercə ümumi normaya zidd olan adam)*
**antiproton** [ˌæntıˈproutɔn] *n fiz.* antiproton
**antiquary** [ˈæntıkwərı] *n* **1.** antikvar, əntiqəçi *(əntiqə şeylərlə maraqlanan);* **2.** antikvar *(əntiqə şeylər alverçisi);* **3.** bukinist *(köhnə və nadir kitablar alıb-satan adam)*
**antiquated** [ˈæntıkweıtıd] *ad* **1.** köhnəlmiş, köhnə; dəbdən düşmüş/çıxmış, köhnə modalı; **2.** ömrünü sürmüş, dövrünü keçirmiş, vaxtı keçmiş; köhnəlmiş; ~ **notions** köhnəlmiş təsəvvürlər/ anlayışlar / anlamlar; ~ **words** köhnəlmiş (arxaik) sözlər; ~ **laws** köhnə / qüv-vəsini itirmiş qanunlar
**antique** [ænˈtı:k] *n* qədim abidə, qədim incəsənət əsəri *(xüs. qədim yunan və Roma tarix və mədəniyyətinə aid)*; qədimdə düzəldilmiş zərgərlik əşyaları; **an ~ dealer** ətiq / əntiqə əşyalar alverçisi
**antiquities** [ænˈtıkwıtız] *n pl* **1.** qədim abidələr *(xüs. qədim dünyanın)*; **Greek and Roman ~** yunan və Roma abidələri; **2.** *arx.* qədim zamanların adətləri/ənənələri
**antiquity** [ænˈtıkwıtı] *n* **1.** qədimlilik, qədimdən qalma şey/əşya; **nations/history of ~** qədim dünya xalqları / tarixi; **2.** çox qədim; *Athens is a city of great antiquity Afina çox qədim şəhərdir*
**anti-revolutionary** [ˈæntıˌrevəˈlu:ʃnərı] *adj* əksinqilabi, əksinqilabçı
**anti-Semite** [ˌæntıˈsi:maıt] *n* antisemit *(yəhudiləri sevməyən adam)*
**anti-semitic** [ˌæntısıˈmıtık] *adj* antisemit
**anti-Semitism** [ˌæntıˈsemıtızm] *n* antisemitizm *(yəhudilərə qarşı ədavət)*
**antiskid** [ˈæntıˈskıd] *adj* sürüşməyən, sürüşmənin qarşısını alan
**antisocial** [ˈæntıˈsouʃl] *adj* **1.** antisosial; cəmiyyətə zidd, cəmiyyətin mənafeyinə zidd; **2.** adamayovuşmayan, adamdan qaçan, ünsiyyətsiz; *Jane is very friendly, but her husband's rather antisocial Ceyn çox mehribandır, amma / lakin onun əri bir qədər adamayovuşmazdır*
**anti-tank** [ˈæntıˈtæŋk] *adj hərb.* tanka qarşı, tank əleyhinə; ~ **defence** tanka qarşı müdafiə; ~ **weapon** tank əleyhinə silah; ~ **rocket luncher** tank əleyhinə reaktiv qumbaraatan
**antitheism** [ˌæntıˈθi:zm] *n* = **atheism**
**antitheist** [ˈæntıˈθi:ıst] *n* = **atheist**
**antitheses** [ænˈtıθısi:z] *n* **antithesis** *isminin cəm forması*
**antithesis** [ænˈtıθısıs] *n (pl* **-ses***)* **1.** *fəls.* antitezis *(tezisə qarşı sürülən fikir);* **2.** tam əkslik; **striking/complete ~** kəskin / tam əkslik, kəskin kontrast
**antithesize** [ænˈtıθısaız] *v fəls.* antitezis vasitəsilə inkar etmək; antitezis söyləmək / gətirmək
**antithetic** [ˌæntıˈθetık] *adj fəls.* tam əks/zidd
**antithetical** [ˌæntıˈθetıkəl] *adj* = **antithetic**
**antithetically** [ˌæntıˈθetıkəlı] *adv fəls.* **1.** antitezis funksiyasında, antitezis olaraq; **2.** tam əks / zidd
**antiwar** [ˌæntıˈwɔ:] *adj* müharibəyə qarşı, müharibə əleyhinə; ~ **demonstration** müharibə əleyhinə nümayiş
**antonym** [ˈæntənım] *n dilç.* antonim
**antonymous** [ænˈtɔnıməs] *adj dilç.* antonim
**antonymy** [ænˈtɔnımı] *n dilç.* antonimlik
**a number 1** [ˈeıˈnʌmbəwʌn] *amer. d.d.* əla, birinci növ, birinci dərəcəli, ən yaxşı
**anus** [ˈeınəs] *n anat.* anus
**anxiety** [æŋˈzaıətı] *n* **1.** həyəcan, təlaş, təşviş, əndişə, iztirab, nigaranlıq, narahatlıq; qorxu; **slight/vague/acute ~** yüngül / anlaşılmaz / güclü narahatlıq / təlaş / təşviş/iztirab; **hidden / torturing/mental ~** gizli/əzablı/ruhi iztirab; **to betray/to manifest ~** təlaş/təşviş/əndişə/nigaranlıq/narahatlıq göstərmək; **to be in ~ about *smth.*** bir şey haqqında narahatlıq/əndişə keçirmək; **to wait *smth.* with ~** bir şeyi əndişə ilə / təlaşla/narahatlıqla/nigaranlıqla gözləmək; **2.** *pl* qayğılar, başağrıları, dərdlər; *All these anxieties*

*made her look pale and thin Bütün bu dərdlər /qayğılar onun çöhrəsinin solmasına və arıqlamasına səbəb oldu;* 3. hərarətli / qızğın arzu; cəhd, səy, həvəs; ~ **for knowledge** bilik almağa həvəs/cəhd /səy /arzu; ~ **to find a basis for negotiations** söhbət aparmaq üçün əsas tapmağa səy/cəhd etmə; *My chief anxiety is to help you in every way Mənim əsas/başlıca arzum sənə/sizə bütün vasitələrlə kömək etməkdir*

**anxious** [ˈæŋkʃəs] *adj* 1. narahat olan, həyəcan keçirən, qorxu hissi keçirən; **to be/ to feel ~ about** *smb.'s* **health/ future / welfare** bir kəsin səhhəti/gələcəyi/rifahı haqqında narahat olmaq; ~ **upon** *smth.* bir şeydən narahat olan; 2. həyəcanlı, iztirablı; narahat, qərarsız; ~ **moment** narahat/qərarsız dəqiqə; **to have an ~ period** həyəcanlı / iztirablı dövr keçirmək; 3. canatan, qızğın həvəs göstərən, qızğın cəhd / səy göstərən *(bir şeyə)*; ~ **for success/for safety /for peace** nəaliyyətə /təhlükəsizliyə/sülhə can atan; **to be eagerly/deeply/keenly / terribly ~ to get** *smth.* bir şeyi əldə etmək üçün alışıb yanmaq; *He is anxious to do his best O çox çalışır ki, əlindən gələni etsin; I am anxious for the morning to come Mən gələn səhəri çox səbirsizliklə gözləyirəm; We are anxious that our children should learn well Biz çox istəyirik ki, uşaqlarımız yaxşı oxusunlar;*

◊ **on the ~ seat** ≅ narahatlıq içində, iynə / tikan üstündə oturan kimi

**anxiously** [ˈæŋkʃəslı] *adv* həyəcanla, narahatlıqla, həyəcanla, təlaşla, əndişəli, narahat bir tərzdə / halda

**any**[1] [ˈenı] *adj* 1. *sual və şərt budaq cümlələrində işlədilərkən:* 1) hər-hansı bir, bir; *Did you meet any difficulties? Sən / Siz hər-hansı bir çətinliyə rast gəldinmi / gəldinizmi? Have you read any new books? Sən / Siz hər-hansı bir təzə kitab oxumusanmı /oxumusunuzmu? Do you know any actors personally? Sən /Siz şəxsən hərhansı bir aktyor tanıyırsanmı/tanıyırsınızmı? He knows English if any man does Əgər bir adam ingilis dili bilirsə, o da odur;* 2) bir az, bir qədər; *Have you any milk? Sənin / Sizin bir az südün/südünüz varmı?* 2. *inkar cümlələrdə işlədilərkən:* 1) heç bir; əsla; *He cannot see any difference between these two books O bu iki kitab arasında heç bir fərq görmür? He hasn't any money Onun əsla / qətiyyən pulu yoxdur;* 3. *Təsdiq cümlələrdə işlədilərkən:* 1) istənilən, hər kəs, hər kim; hər hansı *Ask any person you meet Rast gəldiyin/gəldiyiniz hər kəsdən soruş/soruşun; Any plan would be better than no plan Hər-hansı/İstənilən planın olması heç bir planın olmamasından daha yaxşı olardı; Any help will be valuable Hər cür kömək yararlı olacaq;* 2) hətta, hər hansı bir; *In his book we miss any attempt to explain the matter Biz onun kitabında məsələni izah edəcək heç bir cəhd görmürük*

**any**[2] [ˈenı] *pron* 1. *sual və şərt budaq cümlələrində işlənərkən:* biri, birisi; kimsə, nəsə; *Have you any of these? Səndə/Sizdə bunlardan biri/birisi varmı? If any think so, they are mistaken Kimlərsə belə düşünürlərsə, onlar səhv edirlər; If any of them should see him Əgər onlardan kimsə onu görsə idi;* 2. *inkar cümlələrdə işlənərkən:* heç biri, heç nə; *I don't know any of these actors Mən bu aktyorlardan heç birini tanımıram; Will you give me some pencils, please? I can't find any Zəhmət olmasa, mənə bir neçə karandaş ver/verin Mən heç birini də tapa bilmirəm;* 3. *təsdiq cümlələrdə işlənərkən:* 1) hər kim, hər kəs, hər bir; hər hansı, hər birisi; *He is free to choose any of these books Bu kitablardan hər hansı birini seçməkdə o, sərbəstdir; O bu kitablardan hansını istəsə seçə bilər;* 2) kim olur-olsun, nə olur-olsun; *It is ridiculous to suppose there are any who would run risks Riskə gedə biləcək bir kəsin olmasını gümən etmək axmaqlıq olardı*

**any**[3] [enı] *adv* 1. *sual və şərt budaq cümlələrində işlənərkən:* hələ, az-çox, bir qədər, bir az; yenə; *Will you have any more tea? Sən/Siz yenə çay içəcəksənmi?/içəcəksinizmi? Is that any better? Belə daha yaxşı deyilmi?;* ~ **longer** artıq; *If you stay here any longer... Əgər sən / siz burada bir az artıq qalsan / qalsanız...;* 2. *inkar cümlələrdə işlənərkən:* heç, bir az da, bir az da olsa, zərrə qədər də (olsa), qətiyyən, əsla, heç, daha; *He does not live there any longer O daha orada yaşamır; I am not any better Mən qətiyyən / əslə yaxşı deyiləm; She did not get any nearer O qətiyyən / bir az da olsa yaxınlaşmadı;* 3. *təsdiq cümlələrdə işlənərkən:* yenə də, bir də; *I am surprised you come here any more Mən təəccüblənirəm ki, sən / siz bir də bura gəlmisən / gəlmisiniz;* 4. *amer. d.d.* ümumiyyətlə, artıq, əsla, büsbütün, bilmərrə; *It did not influence him any Bu ona əsla təsir etmədi; I haven't fished any for ten years Mən artıq on ildir ki, balıq tutmuram*

**anybody** [ˈenı.bɔdı] *pron* 1. *sual və şərt budaq cümlələrində işlənərkən:* kimsə, bir kəs, kim olursa olsun, hər kəs olursa olsun; *Is there anybody here? Burada kimsə / bir kəs varmı? If anybody thinks this question is not settled, let him speak up Əgər kimsə / bir kəs bu məsələnin həll edilmədiyini fikirləşirsə, qoy dursun danışsın; Is there anybody else who thinks so Daha belə fikirləşən bir kəs varmı?* 2. *inkar cümlələrdə işlənərkən:* heç kim, heç kəs; *She has not see anybody in the street O, küçədə heç kəsi / heç kimi görməyib;* 3. *təsdiq cümlələrdə işlənərkən:* hər bir kəs, hər /istənilən adam; *Anybody can do it Bunu hər kəs / hər adam /hamı/istənilən adam edə bilər; She speaks better than anybody O hər (bir) kəsdən / hamıdan yaxşı danışır;* 4.



çətin ki kimsə (**hardly ~**); *There is hardly anybody there Orada çətin ki kimsə olsun*

**anyhow** [ˈenıhau] *adv* 1. nə olur olsun, necə olur olsun, hər halda; *Anyhow, you must admit I was right Hər halda sən / siz etiraf etməlisən/etməlisiniz ki, mən haqlı idim; I shall go anyhow whether it rains or not Yağış yağsa da, yağmasa da, hər halda mən gedəcəm; I may fail, but anyhow I intend to try hard Ola bilsin ki, mən heç şey əldə edə bilməyim, lakin nə olur olsun əlimdən gələnin hamısını etmək fikrindəyəm; You won't be late anyhow Hər halda sən / siz gecikməyəcəksən / gecikməyəcəksiniz;* 2. heç cür; *We could not get into the building anyhow Biz binaya heç cür daxil ola bilmədik;* 3. səliqəsiz, necə gəldi, bir təhər; *The work was done anyhow İş necə gəldi görülmüşdü;*

◊ **to feel ~** özünü bir təhər/pis hiss etmək

**anyone** [ˈenıwʌn] *pron* = **anybody**

**anyplace** [ˈenıpleıs] *adv amer. d.d.* = **everywhere**

**anything**[1] [ˈenıθıŋ] *pron* 1. *sual cümlələrində və şərt budaq cümlələrində işlənərkən:* bir şey, bir zad; *Is there anything you want Sənin/Sizin istədiyin/istədiyiniz bir şey varmı? If you need anything, they will help you Əgər sənə / sizə bir şey lazım olsa, onlar sənə / sizə kömək edəcəklər; If anything should happen to him... Əgər ona bir şey olsa...; I am going to the market. Anything I can do for you? Mən bazara gedirəm. Sənə / Sizə bir şey lazımdırmı?* 2. *inkar cümlələrdə işlənərkən:* heç şey, heç nə; *He hasn't taken anything O heç nə / heç şey götürməyib; He doesn't do anything at all O əsla heç nə / heç şey etmir;* 3. *təsdiq cümlələrdə işlənərkən:* nə lazımdırsa, hər şeyi, nə olsa, əlindən gələni; *He will do anything to help you O, əlindən gələni edəcək ki, sənə/sizə kömək etsin. Sənə / Sizə kömək etmək üçün o hər şeyi edəcək;* 4. *birləşmələrdə işlənərkən:* ~ **but** 1) deyil, nə istəsən... lakin... deyil; *He is anything but a scholar Ondan nə desən olar, lakin alim yox;* 2) əsla... deyil; *It is anything but pleasant Bu əsla xoşagələn deyil;* **like** ~ sürətlə, var gücü ilə; *Though he ran like anything, he missed the train O, var gücü ilə qaçsa da, qatara çata bilmədi;* **not for** ~ əsla, heç bir vəchlə, heç cürə; *I wouldn't do it for anything Mən bunu əsla/qətiyyən etməzdim;* **hardly** ~ demək olar ki, təxminən; *There's hardly anything left Demək olar ki, heç nə qalmayıb*

**anything**[2] [ˈenıθıŋ] *adv* az-çox, az da olsa, bir qədər, bir az; *Is her dress anything like mine? Məgər onun paltarı az da olsa mənimkinə oxşayır?*

**anytime** [ˈenıtaım] *adv* həmişə, istənilən vaxt, hər vaxt; *You can come anytime you like İstədiyin / İstədiyiniz vaxt gələ bilərsən / bilərsiniz*

**anyway** [ˈenıweı] *adv* = **anyhow 1** *və 3-cü mənalarda*

**anywhere** [ˈenıweə[r]] *adv* 1. *(adət. sual və inkar cümlələrdə işlənir)* hər yerdə, hər tərəfdə, hər yanda; bir yerə, heç yerə / yerdə; *Did you go anywhere yesterday? Sən / Siz dünən bir yerə getmişdinmi / getmişdinizmi? I can't find it anywhere Mən onu heç yerdə tapa bilmirəm;* 2. harada ...orada, istədiyin yerdə; *Sit anywhere you like Harada istəyirsən/istəyirsiniz orada otur / oturun;* 3. haradasa; ~ **from 40 to 60 students** haradasa 40-dan 60-a qədər tələbə; *It costs anywhere from five to ten dollars Bu haradasa 5-10 dollar dəyərindədir, Bunun qiyməti haradasa 5-10 dollardır*

**anywhither** [ˈenıwıðə[r]] *adv arx.* istənilən istiqamətdə

**anywise** [ˈenıwaız] *adv* istənilən yolla/üsulla / vasitə ilə; bir təhər

**A one** [ˈeıˈwʌn] *amer. d.d.* əla, birinci dərəcəli; ən yaxşı

**aorist** [ˈeərıst] *n qram.* aorist *(bəzi dillərdə felin keçmiş zaman formalarından biri)*

**aorta** [eıˈɔ:tə] *n anat.* aorta *(ürəyin sol qarıncığından çıxan baş arteriya)*

**aortal** [eıˈɔ:təl] *adj anat.* aorta; ~ **arch** aorta qövsü

**aortic** [eıˈɔ:tık] *adj anat.* = **aortal**

**apace** [əˈpeıs] *adv* tez, sürətlə; *Old age comes on apace Qocalıq tez/sürətlə gəlir; Ill news comes apace Pis xəbər tez yayılır; Pis xəbərin atı yüyrək olur*

**apaid** [əˈpeıd] *adj arx.* razı, məmnun, xoşhal; razı qalmış / salınmış, xoşnud

**apart**[1] [əˈpa:t] *adv* 1. 1) ayrı, ayrı-ayrı; bir-birindən aralı; *The 2 buildings are 3 miles apart Bu 2 bina bir-birindən 3 mil aralıdır;* **to live /to dwell** ~ ayrı / ayrı-ayrı yaşamaq; 2) kənar, aralı; *The new boy stood apart from his classmates Təzə oğlan sinif yoldaşlarından kənar dayanmışdı; We planted the trees apart Biz ağacları aralı-aralı əkdik / basdırdıq;* 3) kənara; **to set the English books** ~ ingilis kitablarını kənara qoymaq; 2. parça-parça; *He tore the cooked chicken apart and began to eat it O, bişmiş toyuğu parça-parça etdi, sonra onu yeməyə başladı;* **to fall** ~ dağılmaq, sökülmək; **to take the watch/the machine** ~ saatı/ maşını hissələrinə ayırmaq / sökmək; 3.: ~ **from that** ondan başqa / əlavə, onunla yanaşı; ~ **from his knowledge** onun biliyi ilə yanaşı, onun biliyindən əlavə; **to tell/ to know** ~ fərqləndirmək, fərqini görmək; **to keep** ~ qarışdırmamaq; *You must keep apart the various meanings of a word Sən/Siz sözün müxtəlif mənalarını qarışdırmamalısan/qarışdırmamalısınız*

◊ **joking/jesting** ~ zarafatsız, zarafat bir yana

**apart**[2] [əˈpa:t] *v arx.* kənara qoymaq, ayırmaq, bir yana yığmaq; parça-parça etmək

**apartment** [əˈpa:tmənt] *n* 1. mebellə döşənmiş otaq; 2. *amer.* mənzil; **private / spacious** ~ xü-

◊ **to be tied to** ***one's*** **wife's ~s** ≅ arvadının qulu olmaq, arvadağız olmaq; **to be tied to** ***one's*** **mother's ~s** ≅ ana uşağı olmaq, anasız heç nə etməyə qadir olmamaq

**apropos**[1] [ˈæprəpou] *adv* **1.** vaxt ikən, məqamında, yerində; yeri gəlmişkən; *I thought he spoke very apropos Mən fikirləşdim ki, o yerində/məqamında danışdı; John was here yesterday. Apropos, did he mention his new job? Con dünən burada idi. Yeri gəlmişkən, o, yeni işi haqqında bir söz dedimi? The remark was very apropos Bu irad tamam yerində idi;* **2.** o ki, qaldı, əlaqədar olaraq; *Apropos of our talk Söhbətimizlə əlaqədar olaraq*

**apropos**[2] [ˈæprəpou] *adj* yerində deyilən, yeri gəlmişkən deyilən, məqamında söylənilmiş / deyilmiş

**apse** [æps] *n mem.* apsida *(kilsə divarlarında yarımqövsşəkilli çıxıntı)*

**apt** [æpt] *adj* **1.** yaraşan, uyğun gələn, uyğun, münasib, əlverişli; ~ **quotation/remark/comparison** münasib iqtibas/irad/ müqayisə; **2.** meylli; əlamətə malik; ~ **to take fire** asan alovlanan, tez alov tutan; ~ **to rust** paslanmağa meylli, tez pas tutan / paslanan; ~ **to take offence** tez küsən, küsəyən, küsməyə meylli, dəymədüşər; *I am apt to hurry Mən həmişə/müdam tələsirəm;* **3.** bacarıqlı, tez anlayan, zəkalı, qabil, fərasətli, zehinli, tez qavrayan; **an ~ pupil** bacarıqlı / zəkalı / fərasətli / zehinli / tez qavrayan şagird

**aptitude** [ˈæptıtju:d] *n* **1.** yararlılıq, faydalılıq, işə yarama, lazım olma; münasiblik, uyğunluq; müvafiqlik, mütabiqlik; **2.** meyl, təmayül; maillik, meyli olma; **3.** qabiliyyət, istedad, bacarıq; fərasət, zəka, zirəklik, tez başa düşmə; istedadlılıq; **natural ~** təbii istedad; *I've no aptitude for learning languages Mənim dil öyrənməyə qabiliyyətim yoxdur*

**aptly** [ˈæptlı] *adv* **1.** müvafiq tərzdə, lazımi şəkildə; **2.** tez, cəld, asanlıqla, bacarıqla

**aptness** [ˈæptnıs] *n* uyğunluq, mütabiqlik, müvafiqlik; bərabərlik; yararlılıq, faydalılıq, işə yarama; münasiblik, uyğunluq; **2.** qabiliyyət, istedad, bacarıq, zehin; istedadlılıq, fərasət, zirəklik, tez başa düşmə; **3.** meyl, təmayül, təbii xüsusiyyət / xassə

**aqualung** [ˈækwəlʌŋ] *n* akvalanq *(üzgüçünün suyun altında nəfəs almaq üçün istifadə etdiyi cihaz)*

**aqualunger** [ˌækwəˈlʌŋəʳ] *n* akvalanqist

**aquamarine** [ˌækwəməˈri:n] *n miner.* akvamarin *(göyümtül-yaşıl rəngli qiymətli daş)*

**aquaplane** [ˈækwəpleın] *n id.* akvaplan *(idmançının suyun üzərində üstündə durduğu sürətli motorlu qayıq vasitəsilə dartılaraq hərəkətə gətirilən nazik taxta)*

**aquarium** [əˈkweərıəm] *n* akvarium *(balıq və s. su heyvanları saxlamaq üçün şüşə qab / qutu)*

**aquatic** [əˈkwætık] *adj* su, suyun içində və üstündə baş verən / yaşayan; ~ **sports** su idmanı; ~ **plants** su bitkiləri

**aquatical** [əˈkwætıkəl] *adj* = **aquatic**

**aquatically** [əˈkwætıkəlı] *adv* suda, suyun üzərində, su ilə, su yolu ilə

**aquatics** [əˈkwætıks] *n* su idmanı

**Aquila** [ˈækwılə] *n astr.* Qartal bürcü

**aquiline** [ˈækwılaın] *adj* qartal; qartal dimdiyinə oxşar; **an ~ nose** qartal dimdiyinə oxşar burun

**ar** [a:ʳ] *n* **R** *hərfinin adı*

**Arab** [ˈærəb] *n* **1.** ərəb, ərəb qadın/qız; **the ~s** *top. i* ərəblər; **2.** ərəb atı *(zərif və iti qaçan at növü)*;

◊ **city ~, street ~, ~ of the gutter** küçə uşağı, sahibsiz uşaq

**Arabian** [əˈreıbıən] *adj:* ~ **desert** Ərəbistan səhrası; ərəb, ərəb qadını /qızı;

◊ ~ **Nights** *"Min bir gecə" (ərəb nağılları)*

**Arabian camel** [əˈreıbıənˌkæməl] *n zool.* ərəb dəvəsi *(birhürgüclü dəvə növü)*

**Arabian millet** [əˈreıbjənˌmılıt] *n bot.* kalış *(darıyaoxşar dənli bitki)*

**Arabic**[1] [ˈærəbık] *n* ərəb dili; *She is studying Arabic O, ərəb dilini öyrənir*

**Arabic**[2] [ˈærəbık] *adj* ərəb; ~ **literature** ərəb ədəbiyyatı; ~ **numeral** ərəb rəqəmi *(məs. 1. 2. 3 və s.)*

**arable** [ˈærəbl] *adj* şumluq, əkin üçün yararlı; ~ **land** əkin yeri, şumlanmış/əkilmiş yer, şum; ~ **layer** şumlanan qat; ~ **meadow** becərilən çəmən/otlaq

**Aramaic** [ˌærəˈmeıık] *n* aramey dili

**Aramean** [ˌærəˈmi:ən] *n tar.* aramey *(qədim Suriya və Mesopotamiyada yaşamış xalqın nümayəndəsi)*

**arbiter** [ˈa:bıtəʳ] *n* **1.** *hüq.* arbitr *(mübahisəni həll edən və təsirli qərar çıxaran şəxs)*; **2.** ali hakim; hökmdar; ~ **of our fate/of our destinies** bizim taleyimizi/müqəddəratımızı həll edən; **3.** *id.* baş hakim, arbitr

**arbitrage** [ˈa:bıtrıdʒ] *n* **1.** arbitraj *(mübahisəli məsələləri həll edən idarə)*; **2.** münsiflər məhkəməsi

**arbitrament** [a:ˈbıtrəmənt] *n hüq.* münsiflər məhkəməsinin / arbitrajın qərarı

**arbitrarily** [ˈa:bıtrərılı] *adv* **1.** *(kefi)* istədiyi kimi, özbaşına, sərbəst; **2.** despot kimi, despotcasına, zülmkarlıqla, qəddarlıqla

**arbitrariness** [ˈa:bıtrərınıs] *n* **1.** özbaşınalıq, sərbəstlik, özü istədiyi kimi hərəkət etmə; **2.** despotizm

**arbitrary** [ˈa:bıtrərı] *adj* **1.** sərbəst, ixtiyari; özbaşına; təsadüfi; şərti; ~ **choice** ixtiyari /sərbəst seçim, ~ **decision** ixtiyari/ sərbəst qərar; ~ **signs and symbols** *poliqr.* şərti işarələr və nişanlar *(simvollar)*; **2.** dəyişkən, qərarsız; özbaşına; **3.** zalım, müstəbid; hökmlü, amiranə

**arbitrate** [ˈa:bıtreıt] *v* **1.** münsiflər hakimi kimi



çıxış etmək; həll etmək üçün məsələni münsiflər məhkəməsinə vermək; **2.** həll etmək

**arbitration** [ˌa:bıˈtreıʃn] *n hüq.* **1.** mübahisənin münsiflər hakimi tərəfindən həll edilməsi / arbitrajda baxılması; **2.** tərəflərin mübahisəli məsələnin münsiflər məhkəməsinə/ arbitraja verilməsi barədə razılığı; **3.** münsiflər məhkəməsi, arbitraj; **to settle by ~** mübahisəni münsiflər məhkəməsində/arbitrajda həll etmək; **Permanent Court of A.** Haaqada Beynəlxalq məhkəmə

**arbitress** [ˈa:bıtrıs] *n* arbitr *(qadın)*

**arboreal** [a:ˈbɔ:rıəl] *adj* ağacda yaşayan; ~ **animals** ağacda yaşayan heyvanlar

**arboretum** [ˌa:bəˈrı:təm] *n (pl* **-tums** *yaxud* **-ta)** sərgi və ya elmi-tədqiqat işi aparmaq üçün salınmış bağ; ağac yetirmə müəssisəsi

**arbor** [ˈa:bəʳ] *n amer.* = **arbour**

**arbour** [ˈa:bəʳ] *n* yaşıllığa bürünmüş köşk

**arc** [a:k] *n* **1.** *mem.* tağtavan, qübbə; **2.** *riyaz.* qövs

**ark** [a:k] *n d.d* = **arc**

**arcade** [a:ˈkeıd] *n* pasaj *(üstüörtülü bazar, hər iki tərəfində cərgə ilə mağazalar olan qalereya)*; *Burlington Arcade is a famous shopping passage in London Bölinqton Londonda məşhur ticarət pasajıdır*

**Arcadia** [a:ˈkeıdjə] *n* Arkadiya; behişt, cənnət, xoşbəxt ölkə

**arcane** [a:ˈkeın] *adj arx.* sirli, gizli; ~ **knowledge** sirli / gizli bilik

**arch**[1] [a:tʃ] *n mem.* **1.** tağ, tağtavan; **the ~es of a bridge** körpünün tağları; **semi-circular/printed ~es** yarımdairəvi/itiuclu tağ; **triumphal ~** qələbə tağı / qapısı; **2.** tağlı keçid; **3.** qövs; qövsü xatırladan bir şey, tağ formalı bir şey; ~ **of the ribs** *anat.* qabırğa qövsü; ~ **of the aorta** *anat.* aorta qövsü; **4.** *məc.* göy qübbəsi, səma, göy; **the starry ~** ulduzlu səma / göy

**arch**[2] [a:tʃ] *v* **1.** tağ/qübbə tikmək; *The river arched over by a bridge Çayın üzərində körpü salındı/tikildi;* **2.** qövs şəklində əymək; **to ~ the eyebrows** qaşlarını qövs şəklində qaldırmaq; *The cat arched its back Pişik belini qövs şəklində əydi;* **3.** qövs şəklinə salmaq

**arch**[3] [a:tʃ] *adj* **1.** ədalı, işvəli, şivəli, işvəkar; **an ~ smile** işvəli/işvəkar/ədalı təbəssüm; **to look ~** işvəli/işvəkar/ədalı görünmək; **2.** bic, hiyləgər; **an ~ look** bic / hiyləgər baxış; **to give** ***smb.*** **an ~ look** bir kəsə hiyləgərcəsinə/bic-bic baxmaq

**arch-** [a:tʃ-] *(həm də* **archi-, arche-***) pref. Əsasən isimlərdə təsadüf edilir və aşağıdakı mənaları bildirir:* **1.** *titul və rütbə bildirən isimlərdə:* baş, böyük; *məs.* **arch**bishop baş yepiskop, baş keşiş; **arch**duke ersohersoq *(Avstriya prinslərinin titulu)*; **2.** ilkin, başlanğıc, *məs.*, **arch**-father ulu baba; **3.** qatı, ifrat; *məs.*, **arch**-enemy qatı düşmən; **arch**-liar qatı / ifrat yalançı

**archaeography** [ˌa:kıˈɔgrəfı] *n* arxeoqrafiya *(qədim yazıları toplama, öyrənmə, izah və nəşr etmə işi)*

**archaeologer** [ˌa:kıˈɔlədʒəʳ] *n* = **archaeologist**

**archaeologian** [ˌa:kıəˈloudʒıən] *n* = **archaeologist**

**archaeologic** [ˌa:kıəˈlɔdʒık] *adj* arxeoloji

**archaeological** [ˌa:kıəˈlɔdʒıkəl] *adj* = **archaeologic**

**archaeologically** [ˌa:kıəˈlɔdʒıkəlı] *adv* arxeoloji baxımdan, arxeoloji nöqteyi-nəzərdən

**archaeologist** [ˌa:kıˈɔlədʒıst] *n* arxeoloq

**archaeology** [ˌa:kıˈɔlədʒı] *n* arxeologiya *(qədimdən qalma maddi mədəniyyət abidələri əsasında qədim xalqların yaşayış və mədəniyyətini öyrənən elm)*

**archaic** [a:ˈkeıık] *adj* arxaik, köhnəlmiş, köhnə

**archaism** [ˈa:keıızm] *n* arxaizm *(köhnəlmiş və ya dildən çıxmış söz və ya ifadə)*

**archangel** [ˈa:kˌeındʒəl] *n din.* Cəbrail *(mələikə)*

**archbishop** [ˌa:tʃˈbıʃəp] *n* baş yepiskop, baş keşiş

**archbishopric** [ˌa:tʃˈbıʃəprık] *n* baş yepiskopluq, baş keşişlik

**archduke** [ˌa:tʃˈdju:k] *n* ersohersoq *(qədimdə Avstriya prinslərinin titulu)*

**arched** [a:tʃt] *adj* tağşəkilli, tağabənzər, tağlı, tağlardan ibarət

**arch-enemy** [ˌa:tʃˈenımı] *n* qatı düşmən, əsas düşmən

**archer** [ˈa:tʃəʳ] *n* **1.** oxatan; **2.** *astr.* Oxatan bürcü

**archery** [ˈa:tʃərı] *n* **1.** ox atmaq məharəti / qabiliyyəti; **2.** *top i* oxatanın ləvazimatı; **3.** *tar.* oxatanlar dəstəsi; **4.** *tar.* feodalın oxatanları / oxatanlar dəstəsi

**arch-foe** [ˌa:tʃˈfou] *n* insan nəslinin düşməni, şeytan, iblis

**architect** [ˈa:kıtekt] *n* **1.** memar, arxitektor; **2.** yaradıcı, yaradan, qurucu; ~ **of** ***one's*** **own happiness/fortunes** öz xoşbəxtliyinin /taleyinin yaradıcısı /ağası

**architectonic** [ˌa:kıtekˈtɔnık] *adj* **1.** arxitektura, memarlıq; **2.** tikinti

**architectonical** [ˌa:kıtekˈtɔnıkəl] *adj* = **architectonic**

**architectonics** [ˌa:kıtekˈtɔnıks] *n* arxitektura, memarlıq

**architectural** [ˌa:kıˈtektʃərəl] *adj* arxitektura; tikinti; ~ **engineer** tikinti mühəndisi; ~ **engineering** tikinti texnikası

**architecturalist** [ˌa:kıˈtektʃərəlıst] *n* memarlıq /arxitektura üzrə mütəxəssis / ixtisasçı, arxitekturanın / memarlığın bilicisi

**architecturally** [ˌa:kıˈtektʃərəlı] *adv* arxitektura /memarlıq baxımından, arxitektura /memarlıq cəhətdən; *Architecturally (speaking), Venice is very beautiful Arxitektura/Memarlıq baxımından Venesiya çox gözəldir*

**architecture** [ˈa:kıtektʃəʳ] *n* **1.** arxitektura, memarlıq; memarlıq üslubu; **the ~ of ancient**

**Greece** qədim Yunanıstanın arxitekturası/memarlığı; **Arabian / Russian** ~ ərəb / rus arxitekturası/ memarlıq üslubu; 2. quruluş; **the ~ of snow** qarın quruluşu; ~ **of speech** nitqin quruluşu

**archival** [a:'kaıvəl] *adj* arxiv; ~ **depository** arxiv materiallarının saxlanıldığı yer

**archives** ['a:kaıvz] *n* arxiv *(1) köhnə sənəd və yazıları saxlayan idarə; 2) köhnə sənəd və sairə şeylərin saxlanıldığı yer/anbar)*

**archivist** ['a:kıvıst] *n* arxiv müdiri

**arch-traitor** ['a:tʃ'treıtə] *n* 1. əsas satqın; 2. şeytan, iblis

**arch-villain** ['a:tʃ'vılən] *n* əsas cani/cinayətkar

**archway** ['a:tʃweı] *n* tağlı keçid

**archwise** ['a:tʃwaız] *adv* tağ formasında/ şəklində

**arciform** ['a:sıfɔ:m] *adj* qövsşəkilli, qövsəoxşar, qövsvarı

**Arctic**[1] [a:ktık] *n* Arktika *(Yer kürəsinin şimal qütb sahəsi)*

**arctic**[2] ['a:ktık] *adj* 1. arktik, şimal, qütb; **Arctic Pole** Şimal qütbü; ~ **fox** *zool.* şimal tülküsü; 2. çox soyuq, bərk soyuq, buz kimi soyuq; ~ **weather** kəskin şaxta, buz kimi soyuq hava

**-ard** [-əd] *(həm də* **-art)** *suff. Alçaldıcı / Təhqiredici mənaya malik olan isimlərdə təsadüf edilir:* drunk**ard** əyyaş, içki düşgünü; dull**ard** küt, kütbeyin, korazehin; bragg**ard** lovğa, gopçu, özünü öyən

**ardea** ['a:dıə] *n zool.* vağ

**ardent** ['a:dənt] *adj* qızğın, alovlu, atəşin, kəskin, şiddətli, atəşli, hərarətli, odlu, coşğun, ehtiraslı; səyli, çox çalışqan; ~ **love** qızğın /atəşin /alovlu/coşğun məhəbbət; ~ **hate** şiddətli /alovlu/kəskin nifrət; ~ **longing** qızğın/şiddətli /alovlu/coşğun arzu; ~ **champion** odlu/alovlu/ mübariz çempion; ~ **admirer** qızğın/alovlu pərəstişkar; ~ **follower** alovlu/qızğın qeyrətli məsləkdaş; ~ **supporter** alovlu tərəfdaş; *He is an ardent supporter of our team O bizim komandanın qızğın tərəfdarıdır*

**ardently** ['a:dəntlı] *adv* qızğın, alovlu, atəşin; hərarətlə, coşğunluqla, ehtirasla, şövqlə; **to love** ~ hərarətlə/ehtirasla sevmək

**ardometer** ['a:dɔmıtəʳ] *n* ardometr *(yüksək temperaturu ölçmək üçün cihaz)*

**ardor** ['a:dəʳ] *n amer.* = **ardour**

**ardour** ['a:dəʳ] *n* 1. ehtiras, böyük həvəs, coşğunluq, qızğınlıq; **to fight with** ~ coşğunluqla / ehtirasla mübarizə aparmaq; **to argue with** ~ hərarətlə / qızğınlıqla / böyük həvəslə mübahisə etmək; **to damp** *smb.'s* ~ bir kəsi həvəsdən salmaq; 2. çox isti hava; hərarət, isti

**arduous** ['a:djuəs] *adj* 1. çətin, gərgin; ~ **task** çətin tapşırıq; ~ **duty** çətin / gərgin vəzifə; **an** ~ **work** çətin / gərgin iş; 2. yorulmaz, çalışqan; üzücü; **an** ~ **manual labour** çox ağır / üzücü əl əməyi

**arduously** ['a:djuəslı] *adv* 1. güclə, çətinliklə, zorla; 2. yorulmadan, yorulmaq bilmədən; ciddi, ciddiyyətlə; qızğın surətdə

**arduousness** ['a:djuəsnıs] *n* 1. çətinlik, gərginlik; 2. yorulmazlıq, çalışqanlıq

**are**[1] [a:, a:ʳ] **to be** *felinin indiki zamanda cəm şəklinin tam formaları. Bu formalar cəmdə samitlərdən sonra işlənir; reduksiya edilmiş formaları:* [ə, ər] *Bu formalar da cəmdə saitlərdən əvvəl işlənir*

**are**[2] [a:ʳ] *n* ar *(100 $m^2$-ə bərabər olan yer ölçüsü, hektarın yüzdə bir hissəsi)*

**area** ['eərıə] *n* 1. sahə, torpaq sahəsi; **vast** ~ geniş sahə; **sown** ~ səpilmiş sahə; ~ **sown to wheat;** buğda səpilmiş sahə; **wheat growing** ~ buğda yetişdirilən sahə; ~ **of a room** otağın sahəsi; *She hasn't cleaned the area under the table O, stolun altındakı sahəni təmizləməyib;* 2. *riyaz.* sahə; ~ **of a triangle** üçbucağın sahəsi; 3. rayon, məntəqə, zona, vilayət, sahə; **geographic** ~ coğrafi rayon; **populated** ~ yaşayış məntəqəsi; insan yaşayan sahə/yer *(şəhər, kənd, qəsəbə və s.); There aren't many wild birds in this area Bu ərazidə çöl quşları çox deyil, Bu ərazidə çöl quşları azdır;* 4. fəaliyyət sahəsi; *There have been many developments in the area of language teaching Dil öyrətmə sahəsində xeyli inkişaf olmuşdur*

**areal** ['eərıəl] *adj* regional; areal; məhəlli, yerli; ~ **linguistics** areal dilçilik

**arena** [ə'ri:nə] *n (pl həm də* **-ae)** arena, səhnə, meydan; ~ **for boxing match ring** boks meydanı; **in the world** ~ dünya arenasında; **the** ~ **of politics** siyasət arenası / səhnəsi; *The small country became the arena of war between the 2 big powers Bu kiçik ölkə 2 böyük dövlət arasında gedən müharibənin meydanına çevrildi;*

◊ **the** ~ **of the bears and bulls** fond birjası

**aren't** [a:nt, 'a:rənt] 1. *d.d.* **are not** *birləşməsinin qısa forması; They aren't (are not) here Onlar burada deyillər;* 2. **am not** *birləşməsinin qısa forması; I am your friend, aren't I (am I not)? Mən sənin / sizin dostunam/dostunuzam, elə deyilmi?*

**arguable** ['a:gjuəbl] *adj* 1. mübahisəli, sübut tələb edən; ~ **point** mübahisəli məsələ; 2. sübut oluna bilən

**argue** ['a:gju:] *v* 1. **(with, against, about)** mübahisə etmək, bəhs etmək; *What are you arguing about? Sən/Siz nə barədə mübahisə edirsən/edirsiniz?;* 2. dəlil/sübut gətirmək, isbat etmək, əsaslandırmaq; **to** ~ **against** *smth.* bir şey əleyhinə sübut gətirmək; **to** ~ **in favour of** *smth.* bir şeyin lehinə dəlil/sübut gətirmək; *It does not argue much in your favour Bu sənin / sizin lehinizə deyil;* **to** ~ **round and round the subject** məsələnin o yan bu yanına keçmək, məsələnin əsas mahiyyətindən danışmamaq; 3. **(into)** inandırmaq, yola gətirmək; sübut et-



mək; *He argued me into accepting his proposal O, təklifini qəbul etməyə məni inandırdı;* 4. **(out of)** fikrindən daşındırmaq/döndərmək/əl çəkdirmək; **to** ~ *smb.* **out of an opinion** bir kəsi fikrindən / rəyindən daşındırmaq; 5. sübut etmək; **to** ~ **that black is white** qaranın ağ olduğunu sübut etmək; 6. *hüq. arx.* günahkar olduğunu demək, hökm çıxartmaq; müqəssir bilmək, ittiham etmək

**argument** ['a:gjumənt] *n* 1. sübut, dəlil, arqument; **weak / unconvincing** ~ zəif / inandırıcı olmayan sübut, tutarsız/ əsassız dəlil; **to refute** ~**s** sübutları/dəlilləri təkzib etmək; 2. əsaslandırma, dəlil gətirmə, sübut göstərmə; 3. diskussiya, mübahisə; 4. qısa məzmun *(kitabın, poemanın və s.)*

**argumentation** [.a:gjumen'teıʃn] *n* 1. əsaslandırma, dəlil gətirmə, sübut göstərmə; 2. mübahisə, bəhs

**argumentative** [.a:gju'mentətıv] *adj* 1. mübahisə etməyi sevən; *He is very argumentative O, mübahisəni çox sevir;* 2. mübahisəli, davalı

**argumentatively** [.a:gju'mentətıvlı] *adv* mübahisəli bir tərzdə; dəlilə/sübuta əsaslanaraq; *He made his opinions known very argumentatively O öz fikrini / rəyini dəlillərə əsaslanaraq irəli sürdü*

**argute** [a:'gju:t] *adj* 1. kəskin; şiddətli; qulaqbatıran *(səs haq.);* 2. bic; ağıllı, fərasətli; gözüaçıq, açıqgözlü

**aria** ['a:rıə] *n mus.* ariya *(operada tək oxunan mahnı)*

**arid** ['ærıd] *adj* 1. quru, qurumuş; susuz; quraq, yağışsız, yağmursuz; **an** ~ **zone** quraq / yağışsız zona; 2. bəhrəsiz, barsız; **an** ~ **desert** barsız/ bəhər verməyən səhra; 3. maraqsız, darıxdırıcı, usandırıcı, cansıxıcı, üröksıxan; ~ **studies** maraqsız / usandırıcı / darıxdırıcı məşğələlər

**aridity** ['ærıdıtı] *n* 1. quruluq, quraqlıq; 2. səmərəsizlik, faydasızlıq, nəticəsizlik; 3. sıxıntı, darıxma, üzüntü, maraqsızlıq, süstlük

**aridly** ['ærıdlı] *adv* soyuq, darıxdırıcı tərzdə, maraqsızcasına

**aright** [ə'raıt] *adv* düz, doğru, düzgün; **to set** ~ düzəltmək, qayırmaq, qaydaya salmaq; *Have I understood you aright? Mən səni / sizi düz başa düşmüşəm?*

**arise** [ə'raız] *v (pt* **arose** [ə'rouz]; *pp* **arisen** [ə'rızn]) 1. meydana gəlmək/çıxmaq, peyda olmaq; yaranmaq; *A question arose Məsələ meydana çıxdı; Doubts/Difficulties arose Şübhələr / Çətinliklər meydana çıxdı/yarandı;* 2. **(from, out of)** irəli gəlmək, alınmaq, çıxmaq; *Nothing arises out of his statement Onun bəyanatından heç nə çıxmır/alınmır;* 3. *arx. amer.* qalxmaq, durmaq *(yatacaqdan, yerdən);* doğmaq, çıxmaq *(günəş haq.); A strong wind arose and blew our boat onto the rocks Güclü bir külək qalxdı və bizim qayığımızı qayalara çırpdı; I will arise and go now Mən indi durub gedəcəm*

**arisen** [ə'rızn] **arise** *felinin pp forması*

**aristocracy** [.ærıs'tɔkrəsı] *n* aristokratiya, zadəganlıq, zadəgan

**aristocrat** ['ærıstəkræt] *n* aristokrat, əsilzadə, kübar; aristokrat qadın / qız

**aristocratic** [.ærıstə'krætık] *adj* aristokratik, zadəgan, kübar; **an** ~ **family** kübar ailə

**aristocratical** [.ærıstə'krætıkəl] *adj* = **aristocratic**

**aristocratically** [.ærıstə'krætıkəlı] *adv* aristokratcasına, aristokrata məxsus bir tərzdə, kübarcasına

**aristocraticism** [.ærıstə'krætısızm] *n* aristokratlıq, zadəganlıq, kübarlıq

**arithmetic** [ə'rıθmətık] *n* 1. hesab; **four operations of** ~ hesabın dörd əməliyyatı, hesabda dörd əməliyyat; 2. *d.d.* hesab haqqında bilik /bilgi; *His arithmetic is poor O, hesabdan zəifdir;* 3. *d.d.* hesab dərsliyi

**arithmetical** [.ærıθ'metıkəl] *adj* hesab; ~ **progression** hesab silsiləsi

**arithmetically** [.ærıθ'metıkəlı] *adv* hesab baxımından; *We found the answer arithmetically Biz cavabı hesab baxımından tapdıq*

**arithmetician** [ə.rıθmə'tıʃn] *n* hesab elmi ilə məşğul olan adam, hesab üzrə mütəxəssis

**arithmograph** [ə'rıθməgra:f] *n* arifmoqraf *(avtomat hesab maşını)*

**arithmometer** [.ærıθ'mɔmıtəʳ] *n* arifmometr *(hesablama maşını)*

**ark** [a:k] *n* Nuhun gəmisi *(dini əfsanələrdə Nuhun tikdiyi, içərisində öz ailəsini və hər bir növ heyvandan 2 dənəsini dünyanı basan daşqından xilas etdiyi böyük gəmi);*

◊ **to touch/to lay hands on the** ~ murdarlamaq; təhqir etmək *(bir şeyi)*

**arm**[1] [a:m] *n* I 1. qol *(çiyindən ələ qədər);* **right** ~ sağ qol; **at** ~**s length** qol uzunluqda; **to run/to rush/to fling/to fly into** *smb.'s* ~**s** bir kəsin qolları arasına atılmaq; **under** *one's* ~ qoltuğu altında; 2. güc, hakimiyyət, qüdrət; **secular** ~ dünyəvi hakimiyyət; **the** ~ **of the law** qanunun gücü; 3. heyvanların qabaq ayaqları; 4. paltarın qolu; 5. ensiz dəniz körfəzi; 6. çayın qolu;

◊ **infant in** ~ südəmər uşaq; **to rescue** *smb.* **from the** ~**s of death** bir kəsi ölümün pəncəsindən qurtarmaq; **to fold** *one's* ~**s** heç nə etmədən oturmaq, boş-bikar / avara gəzmək, veyllənmək; **to receive / to welcome** *smb.* **with open** ~**s** bir kəsi açıq ürəklə qəbul etmək; *She welcomed the guests with open arms O, qonaqları ürək açıqlığı ilə/ mehribanlıqla qarşıladı; Stretch your arm no further than your sleeve will reach at söz ≅ Ayağını yorğanına görə uzat*

**arm** [a:m] *n* II 1. *pl* silah; **in** ~**s** silahlanmış, silah altında; ~**s of precision** hücuma lazım olan dəqiq silah; **up in** ~**s** mübarizəyə hazır; tam hərbi hazırlıq vəziyyətində; **under** ~**s** silah altında;

**to be under ~s** hərbi xidmətdə olmaq; *To arms! Silahı götürün!;* **to carry ~s** silah gəzdirmək; **to bear ~s** orduda xidmət etmək; **to rise in ~s** *(against)* silaha sarılmaq; **to throw down** *one's* **~s** silahını atmaq / yerə qoymaq, təslim olmaq; 2. *pl şair.* yaraq-əsləhə *(qalxan, geyim və s.)*; 3. ordu növü; *Our air arm bombed the enemy Bizim hərbi-hava qüvvəmiz düşməni bombaladı;* **all ~s of the fighting forces** silahlı qüvvələrin bütün ordu növləri; 4. müharibə; **success in ~s** müharibədə müvəffəqiyyət

**arm²** [a:m] *v* silahlandırmaq; silahlanmaq; *A warship was armed with nuclear weapons Hərbi gəmi atom silahı ilə silahlandırılmışdı; I warn you that I am armed Mən sizi xəbərdar edirəm ki, mən silahlıyam;* **to ~ oneself** silahlanmaq; **to ~ oneself with knowledge** biliklə silahlanmaq

**armada** [a:'ma:də] *n* armada *(böyük hərbi flot)*; **the invincible/Spanish Armada** *tar.* "Məğlubedilməz armada; *The Spanish Armada sailed to England in 1588 Məğlubedilməz armada İngiltərəyə doğru 1588-ci ildə hərəkət etdi*

**armament¹** ['a:məmənt] *n* 1. silahlanma; 2. *pl* silah, yaraq; **conventional ~s** adi silahlar; **nuclear ~s** nüvə silahları; **rush of ~s** sürətlə silahlanma; 3. ağır dəniz topları; 4. *pl* silahlı qüvvələr

**armament²** ['a:məmənt] *adj:* **~ drive / race** sürətlə silahlanma

**armature** ['a:mətjuəʳ] *n* 1. *hərb.* zireh; 2. müdafiə silahları; 3. *tex.* armatur; 4. *el.* rotor

**armband** ['a:mbænd] *n* qol sarğı *(rəsmi vəziyyəti göstərmək üçün qola bağlanmış parça)*

**armchair** ['a:mtʃeəʳ] *n* kreslo, qoltuqlu kürsü

**armed** [a:md] *adj* silahlı, yaraqlı, silahlanmış; **~ neutrality** silahlı bitərəflik; **~ forces** *amer.* silahlı qüvvələr, qoşunlar;
◊ **~ to the teeth** dişinə qədər silahlanmış

**Armenian¹** [a:'mi:njən] *n* erməni, erməni qadını; **the ~s** *top. i* ermənilər

**Armenian²** [a:'mi:njən] *adj* erməni; **the ~ language** erməni dili

**armful** ['a:mful] *n* 1. bir qucaq, qucaq dolusu; **~ of hay** bir qucaq ot *(quru)*; 2. böyük miqdar, çox; 3. *amer. d.d.* kök qız

**armhole** ['a:mhoul] *n* qol yeri *(paltarda)*

**arm-in-arm** ['a:mɪn'a:m] *adv* 1. qol-qola; **to walk ~** qol-qola gəzmək; 2. əl-ələ; sıx əlaqədə

**arming** ['a:mɪŋ] *n* 1. silahlanma; 2. hərbi sursat

**armipotence** [a:'mɪpoutəns] *n* hərbi güc / qüdrət / qüvvə

**armipotent** [a:'mɪpoutənt] *adj* qüvvətli; qüdrətli, güclü, hərbi cəhətdən qüvvətli

**armistice** ['a:mɪstɪs] *n* barışıq, sülh, hərbi əməliyyatın dayandırılması; **general / partial ~** ümumi / qismən barışıq

**armless** ['a:mlɪs] *adj* I 1. qolsuz; 2. budaqsız

**armless** ['a:mlɪs] *adj* II silahsız, əliyalın

**armlet** ['a:mlɪt] *n* 1. *bax* **armband**; 2. qolbaq, bilərzik; 3. çayın qolu; 4. kiçik dəniz körfəzi

**armored** ['a:məd] *adj amer.* = **armoured**

**armorer** ['a:mərəʳ] *n amer.* = **armourer**

**armour¹** ['a:məʳ] *n* 1. *top.i* yaraq *(qalxan, dəmir geyim, dəbilqə və s.)*; 2. zireh *(gəmidə, tankda və s.)*; 3. skafandr *(dalğıc, kosmonavt üçün geyim)*

**armour²** ['a:məʳ] *v* zirehlə örtmək

**armour-bearer** ['a:mə,beərəʳ] *n tar.* silahdar *(orta əsrlərdə cəngavərin silahını daşıyan gənc əsgər)*

**armoured** ['a:məd] *adj* zirehli; **an ~ car** zirehli avtomobil; **an ~ train** zirehli qatar; **an ~ cable** zirehli kabel; **an ~ glass** sınmayan şüşə; **~ concrete** dəmir-beton

**armourer** ['a:mərəʳ] *n* 1. silah zavodunun sahibi; 2. silah düzəldən/qayıran usta, silah ustası; tüfəngsaz

**armoury** ['a:mərɪ] *n* = **arsenal**

**armpit** ['a:mpɪt] *n* qoltuq, qoltuqaltı çökəklik;
◊ **to be in debt up to the ~s** ≅ *amer.* boğaza qədər borc içində olmaq

**arm-saw** ['a:msɔ:] *n* əl mişarı

**army¹** ['a:mɪ] *n* 1. ordu; **the Azerbaijani ~** Azərbaycan ordusu; **Army in the field** döyüşən ordu; **standing ~** daimi ordu; **to join/to enter the ~** orduda xidmətə başlamaq; **to go into the ~** əsgərliyə getmək; **~ of occupation** istilaçı ordu; 2. *amer.* quru qoşunları; 3. qoşun, çoxlu, dəstə; külli miqdar; **an ~ of children** bir qoşun uşaq; **an ~ of workers** külli miqdarda fəhlə; **~ of insects** bir qoşun / dəstə həşərat

**army²** [a:mɪ] *adj* ordu; hərbi; **~ troops** ordu hissələri *(böyük qoşun birləşməsinə daxil olmayan)*; **~ ambulance** səyyar xəstəxana/hospital; **~ bisquits** *d.d.* suxarı *(qızardılmış çörək parçaları)*; **~ bible** *hərb. d.d.* ustav, nizamnamə; **Army Manual** quru qoşunlarının nizamnaməsi; **Army Regulations** ordu üzrə əmrlər/sərəncamlar *(ABŞ-da)*; **~ medical service** hərbi-sanitar xidməti

**army-beef** ['a:mɪbi:f] *n hərb. d.d.* ət konservləri

**army-corps** ['a:mɪ'kɔ:] *n* ordu korpusu

**army-list** ['a:mɪ'lɪst] *n* ordunun zabitlər heyətinin siyahısı

**aroma** [ə'roumə] *n (pl həm də* **-ata***)* 1. ətir, rayihə, aromat, xoşagələn iy; **delicate ~** zərif ətir / rayihə; **the ~ of the hot coffee** isti kofenin iyi / aromatı; 2. xüsusiyyət; güclə sezilən əlamət; *There was an aroma of wealth in the room Otaqda zənginlik əlaməti vardı*

**aromatic** [,ærə'mætɪk] *adj* xoş iyli, ətirli; **~ plants** ətirli / xoş iyli bitkilər; *Aromatic plants are often used in cooking Ətirli bitkilər tez-tez aşbazlıqda istifadə edilir*

**aromatically** [,ærə'mætɪkəlɪ] *adv* ətirli bir tərzdə, ətir cəhətdən

**aromatization** [ə,roumətɪ'zeɪʃn] *n* 1. ədva əlavə etmə, ədva vurma; 2. *kim.* aromatizasiya *(neftdən, benzindən və sairədən aromatik birləşmələr alma üsulu)*



**arose** [ə'rouz] **arise** *felinin pt forması*

**around¹** [ə'raund] *adv* 1. ətrafda, hər tərəfdə, hər yana, hər tərəfə; *He looked around but could see nobody O, ətrafa baxdı, lakin heç kəsi görə bilmədi; A dense fog lay around Hər tərəfi qatı duman bürümüşdü/basmışdı;* **to follow** *smb.* **~** bir kəsi hər yerdə izləmək; 2. təxminən; **~ five miles** təxminən beş mil; **~ 30 years** təxminən 30 il; 3. geri; *He turned around when he heard a noise behind him O, arxasında səs eşidərkən geri döndü;* 4. dövrəsi; **a tree three meters ~** dövrəsi üç metr olan ağac; 5. geri; **to turn ~** geri dönmək; *Turn around! You are going the wrong way Geri dön/dönün! Sən/Siz səhv yolla gedirsən/gedirsiniz*

**around²** [ə'raund] *prep* 1. *təsirlik şəkilçisi: -ı, -i, -a, -ə: vasitəsilə tərcümə edilir;* **to travel ~ the world** dünyanı səyahət etmək; *He wrapped his blanket around him O, yorğanına büründü; Woods lay around the house Evin ətrafını ağac bürümüşdü; She gave a glance around the room O, otağa göz gəzdirdi O, otağa baxdı;* 2. *amer. d.d.* yaxınlıqda, yaxınlığında; *The child was playing around the house Uşaq evin yaxınlığında oynayırdı;* 3. *amer. d.d.* hər yerdə, hər yanda, hər tərəfdə; *He leaves his books around the house O, kitablarını evdə hara gəldi qoyur;* 4. *amer. d.d.* təxminən, təqribən; **~ four o'clock** təxminən saat dörd; *It costs around five thousand dollars Bu təxminən / təqribən beş min dollar dəyərindədir*

**around-the-clock** [ə'raundðə'klɔk] *adj* gecə-gündüz

**arouse** [ə'rauz] *v* 1. oyatmaq, oyandırmaq; **to ~** *smb.* **from his sleep** bir kəsi yuxusundan / yuxudan oyatmaq; *We arouse him from his sleep Biz onu yuxudan oyatdıq;* 2. oyanmaq, ayılmaq; *The village began to arouse Kənd oyanmağa başladı;* 3. səbəb olmaq, oyatmaq, doğurmaq; törətmək; **to ~ pity/sorrow/suspicions** rəhm / kədər/şübhə doğurmaq; *Her strange behaviour aroused the suspicions of the police Onun qəribə hərəkəti polisdə şübhə doğurdu / oyatdı*

**arpeggio** [a:'pedʒɪou] *n (pl* **-os** [-ouz]) *mus.* arpecio *(akkordları əmələ gətirən tonları birdən deyil, bir-birinin dalınca götürmə üsulu)*

**arrack** ['ærək] *n* arak *(düyüdən və ya palma şirəsindən hazırlanmış spirtli içki)*

**arraign** [ə'reɪn] *v* 1. *hüq.* məhkəməyə cəlb etmək *(cinayət işi üzrə)*; ittiham irəli sürmək; 2. təqsirləndirmək, müqəssir etmək; günahkar bilmək; ittiham etmək, məsuliyyətə cəlb etmək; **to ~ before the bar of public opinion** ictimai rəy məhkəməsinə cəlb etmək

**arraignment** [ə'reɪnmənt] *n* 1. *hüq.* məhkəməyə cəlb etmə *(cinayət işi üzrə)*, ittiham irəli sürmə; 2. kəskin / ciddi tənqid, məzəmmət, məzəmmət etmə, töhmət

**arrange** [ə'reɪndʒ] *v* 1. qaydaya salınmış, düzülmüş, işlənmiş; **to ~** *one's* **hair /***one's* **dress/***one's* **tie** saçını/paltarını/qalstukunu qaydaya salmaq; **to ~ affairs** işi qaydasına salmaq; 2. düzmək; qaydaya salmaq; müəyyən qayda ilə yerləşdirmək; təsnif etmək; **to ~ books in alphabetical order** kitabları əlifba sırası ilə düzmək; **to ~ the children according to height** uşaqları boy sırasına görə düzmək; *He arranged his papers before starting to write O, yazmağa başlamazdan əvvəl kağızlarını qaydaya saldı;* 3. şərtləşmək, razılaşmaq, razılığa gəlmək; **to ~ about transportation** yükdaşıma haqqında razılığa gəlmək; **to ~ for an appointment** görüş haqqında razılaşmaq/razılığa gəlmək; 4. **to ~ oneself** özünü qaydaya salmaq; 5. yoluna qoymaq, düzəltmək, qaydaya salmaq, həll etmək; *Differences have been arranged Fikir ayrılığı aradan qaldırılıb;* 6. ölçü götürmək, hazırlıq işləri görmək; 7. yenidən işləmək; dəyişdirmək; işləmək; **to ~ a novel for the stage** romanı səhnə üçün işləmək; 8. *mus.* tərtib etmək, uyğunlaşdırmaq

**arranged** [ə'reɪndʒd] *adj* qaydaya salınmış / salma, düzəltmə; işlənmiş; **a symphony ~ for the piano** piano üçün işlənmiş simfoniya

**arrangement** [ə'reɪndʒmənt] *n* 1. qaydaya salma; müəyyən qayda üzrə yerləşdirmə; yerbəyer etmə, yerləşdirmə, düzmə; sistemləşdirmə; sistemə salma / salınma, nizama salma; **the ~ of a library** kitabxananı sistemləşdirmə / sistemə salma; **~ by size** ölçüyə görə yerləşdirmə; 2. razılıq, razılaşma; saziş, müqavilə; **to come to an ~** razılığa gəlmək, razılaşmaq; **to make an ~** razılıq əldə etmək; 3. həll olunma, həll edilmə, həll etmə *(mübahisəli məsələləri)*; **~ of a conflict** ixtilafın / münaqişənin həlli / həll olunması; 4. *pl* tədbir; **to make ~s (for)** tədbir görmək; 5. *id.* **~ of the lanes** qaçış yollarının müəyyənləşdirilməsi

**arrant** ['ærənt] *adj* əsl, həqiqi, tam; qatı, qəddar; **~ fool** tam gic / axmaq; **an ~ thief** əsl/qatı oğru; **~ nonsense** tam/əsl mənasızlıq; **~ hypocrite** qatı riyakar / ikiüzlü

**arras** ['ærəs] *n* qobelen *(divar xalçası)*

**array¹** [ə'reɪ] *n* 1. cərgə, sıra, səf, hərbi düzülüş; sıraya durma; 2. ordu, qoşun; 3. kütlə; çoxlu, külli miqdar; 4. *şair.* geyim, paltar, libas; **holiday ~** bayram paltarı / libası; **in military ~** hərbi paltarda / geyimdə /libasda

**array²** [ə'reɪ] *v* 1. geyindirmək, bəzəndirmək, geyindirib-kecindirmək; **to ~ oneself** geyinmək, geyinib-kecinmək; 2. *hərb. d.d.* döyüş vəziyyəti tutmaq

**arrears** [ə'rɪəz] *n* 1. borc *(pul)*; **~s of interest**

vaxtı keçmiş / ötmüş borcun faizi; ~s of rent ev kirayəsinin borcu; to collect ~s *mal.* vaxtı uzadılmış məbləği inkasso etmək; 2. gerilik, geri qalma; ~s of housing mənzil tikmə işində gerilik / geri qalma; ~s of work görülməmiş / yerinə yetirilməmiş iş;

◊ to be in ~(s) 1) borcu olmaq; 2) geri qalmaq *(bir şeydə)*

**arrest[1]** [ə'rest] *n* 1. həbs, həbs etmə, dustaq etmə; to put *smb.* under ~ bir kəsi həbs etmək/tutmaq; ~ to the room ev dustağı, gözdustağı; 2. başını bağlama *(əmlakın)*; ~ of a vessel gəminin həbs edilməsi; to put *smth.* under ~ hər-hansı əmlakın başını bağlamaq; 3. ləngitmə, yubatma, gecikdirmə; dayandırma, kəsmə; ~ of development inkişafı ləngitmə/yubatma / gecikdirmə; ~ of haemorrhage *tib.* qanaxmanı dayandırma / kəsmə; ~ of judgement *hüq.* 1) hökmün yerinə yetirilməsini dayandırma; 2) hökm çıxarmanı təxirə salma

**arrest[2]** [ə'rest] *v* 1. tutmaq, həbs etmək; əmlakın başını bağlamaq; to ~ goods malın başını bağlamaq; *The policeman arrested the thief Polis nəfəri oğrunu tutdu / həbs etdi;* 2. dayandırmaq, qarşısını almaq; ləngitmək; to ~ growth inkişafı ləngitmək; to ~ inflation inflyasiyanın qarşısını almaq; *The doctor arrested the growth of the disease Həkim xəstəliyin inkişafının qarşısını aldı;* 3. cəlb etmək *(diqqəti və s.)*, yetirmək, vermək; to ~ attention /interest /sight diqqəti/marağı/baxışı cəlb etmək; *The bright lights arrested the child's attention Parlaq işıqlar uşağın diqqətini cəlb etdi;* 4. *tex.* hərəkəti dayandırmaq, dayandırmaq *(maşını və s.)*

**arresting** [ə'restıŋ] *adj* diqqəti cəlb edən; cəlbedici, çox maraqlı; ~ speech çox maraqlı / cəlbedici nitq

**arrival[1]** [ə'raıvəl] *n* 1. gəlmə, gəliş *(miniklə)*, gəlib çıxma, varid olma, çatma; unexpected ~ gözlənilməz gəlmə / gəliş; port of ~ varid olma / gəlmə limanı; on ~ of the train qatarın gəlişi ilə, qatar gələrkən; 2. qəbul etmə, əldə etmə *(razılıq və s.)*; ~ at a decision qərarın qəbul edilməsi; 3. təzə gələn *(şəxs və ya əşya haq.)*; *There were several new arrivals in the school Məktəbdə bir neçə yeni gələn (şagird) vardı*

**arrival[2]** [ə'raıvəl] *adj* gəlmə, çatma; ~ time gəlmə vaxtı *(qatarın və s.)*; ~ platform qəbul platforması *(qatarı və s.)*

**arrive** [ə'raıv] *v* 1. (at, in, upon) gəlmək, gəlib çatmaq, varid olmaq; to ~ home evə gəlmək; to ~ safely sağ-salamat gəlib çatmaq/çıxmaq; to ~ in London Londona varid olmaq; *The police arrived upon the scene Polis hadisə yerinə gəldi;* to ~ punctually/in good time düz vaxtında/vaxtında gəlib çatmaq; to ~ at the station vağzala gəlmək/gəlib çatmaq; 2. (at) əldə etmək, gəlmək; to ~ at understanding anlaşma əldə etmək, anlaşmaya nail olmaq; to ~ at a decision qərar qəbul etmək, qərara gəlmək; 3. müəyyən yaşa/səviyyəyə çatmaq; to ~ at a fortune zənginlik / varidat əldə etmək; to ~ at the age of fifteen on beş yaşına çatmaq; 4. çatmaq, gəlmək *(vaxt haq.) At last the day arrived Nəhayət həmin gün gəlib çatdı / çatdı / gəldi; At last our holidays arrived Nəhayət bizim məzuniyyətimiz gəlib çatdı;* 5. doğulmaq, dünyaya gəlmək *(uşaq haq.) Her baby arrived during the night Onun uşağı gecə vaxtı doğuldu / dünyaya gəldi*

**arrogance** ['ærəgəns] *n* lovğalıq, təkəbbür, təşəxxüs, iddia; intolerable ~ dözülməz lovğalıq / təkəbbür / təşəxxüs

**arrogant** ['ærəgənt] *adj* lovğa, təşəxxüslü, təkəbbürlü, iddialı, dikbaş, heç kəsi bəyənməyən, başqalarına xor baxan, özündən razı olan, özünübəyənən; ~ manners lovğa / təkəbbürlü / iddialı hərəkətlər

**arrogantly** ['ærəgəntlı] *adj* lovğalıqla, təkəbbürlə, iddialı bir tərzdə, təşəxxüslə; to speak ~ lovğalıqla/təkəbbürlə / təşəxxüslə danışmaq

**arrogate** ['ærougeıt] *v* 1. dikbaşlıqla/təkəbbürlə /israrla tələb etmək; 2. mənimsəmək, yiyələnmək; *They arrogated to themselves this right Onlar bu hüququ mənimsədilər; He arrogated privileges to his staff O öz əməkdaşları üçün imtiyazlar əldə etməyə cəhd etdi / göstərdi; Having seized power in the country, he arrogated to himself the right to change the law Hakimiyyəti zəbt etdikdən sonra o, qanunu dəyişmək hüququnu mənimsədi;* 3. əsası olmadan aid etmək, istinad etmək, ayağına yazmaq

**arrogation** [ˌærou'geıʃn] *n* 1. əsası olmayan/əsaslandırılmamış tələb; 2. mənimsəmə, sahib çıxma, yiyələnmə

**arrow[1]** ['ærou] *n* 1. ox; to shoot an ~ ox atmaq; as straight as an ~ ox kimi düz; 2. ox işarəsi *(istiqamət bildirmək üçün işarə)*

**arrow[2]** ['ærou] *v* 1. ox atmaq; 2. ox ilə işarə etmək; *The positions are arrowed on the map Mövqelər xəritədə oxla işarə edilmişdir*

**arrow-head** ['ærouhed] *n* ox ucluğu *(oxun ucuna taxılan daş və ya dəmir parçası)*

**arrowy** ['ærouı] *adj* 1. oxşəkilli, oxabənzər; şiştəpəli; 2. çox oxdan ibarət olan; ~ storm ox tufanı; 3. ox kimi cəld / tez; ~ swallow ox kimi cəld uçan qaranquş; 4. iti, zəhərləyici, tikanlı, acı, yandırıcı; ~ words tikanlı/acı/yandırıcı sözlər; ~ wit iti ağıl; ~ tongue tikanlı / zəhərli dil

**arse** [a:s, ærs] *n* 1. *tab.* göt, *Get off your arse Yanını qaldır (yəni oturduğun bəsdir)*; to lick *smb.'s* ~ bir kəsin güngörməzini yalamaq; anus; 2. zəhlətökən axmaq adam;

◊ to ~ about / around boş yerə vaxt itirmək; *Stop arsing about and get back to work Boş yerə vaxt keçirməyi qurtar /qurtarın, işə qayıt /qayıdın*



**arsenal** ['a:sənl] *n* 1. cəbbəxana; 2. topxana; silah anbarı; *The police found an arsenal of knives and guns in the murderer's house Polis caninin evindən bıçaq və silah anbarı tapdı*

**arsenic[1]** ['a:snık] *n kim.* arsen

**arsenic[2]** [a:'senık] *adj* arsenli, tərkibində arsen olan; ~ acid arsenat turşusu; ~ powder arsen tozu

**arsenical** [a:'senıkəl] *adj* = arsenic[2]

**arsheen** [a:r'ʃi:n] *n* arşın

**arson** ['a:sn] *n hüq.* qəsdən od vurma/ yandırma; *The police suspect arson Polis qəsdən odvurmadan şübhələnir*

**art[1]** [a:t] *n* 1. incəsənət; antique ~ qədim incəsənət; popular (fork) ~ xalq incəsənəti; work of ~ incəsənət əsəri; masterpiece of ~ incəsənətin şah əsəri; to be concerned in ~ incəsənətlə maraqlanmaq / məşğul olmaq; to be talented for an ~ incəsənətin hər hansı bir növünə istedadı olmaq; *We studied the art of the early Japanese Biz erkən yaponların incəsənətini öyrəndik;* 2. sənət, peşə; ustalıq, bacarıq; the ~ of painting rəssamlıq sənəti; the ~ of making bread çörək bişirmək ustalığı /bacarığı; military ~ hərbi ustalıq; culinary ~ aşpazlıq sənəti/ustalığı / bacarığı;

◊ black ~ sehrbazlıq, cadugərlik; hermetic ~ əlkimya, yalançı kimya; for ~'s sake sənət naminə; to be ~ and part in *smth.* bir şeydə əli olmaq; *Art is long, life is short at söz. Həyat qısa, incəsənət əbədidir*

**art[2]** [a:t] *adj* incəsənət; ~ gallery incəsənət qalereyası; an ~ book incəsənət üzrə kitab; ~ exhibition şəkil sərgisi/qalereyası; an ~ critic sənətşünas; incəsənət mütəxəssisi; an ~ criticism sənətşünaslıq, incəsənət elmi; ~ edition bədii nəşr; an ~ school rəssamlıq məktəbi

**arterial** [a:'tıərıəl] *adj anat.* 1. arterial; ~ bleeding arterial qanaxma; *Arterial blood is bright red Arterial qan açıq qırmızı rəngdə olur;* 2. magistral; ~ road magistral/ əsas yol; ~ traffic əsas küçə / yol ilə hərəkət; ~ roads leading into London Londona aparan/gedən magistral yollar

**arteriosclerosis** [a:ˌtıərıousklə'rousıs] *n tib* arterioskleroz *(arteriya divarlarının qalınlaşıb elastikliyini itirməsindən ibarət xəstəlik)*

**artery** ['a:tərı] *n* 1. *(pl -ies)* arteriya *anat. (ürəkdən bədənin müxtəlif üzvlərinə qan aparan damar);* 2. magistral; əsas yol/kanal; arteries of commerce əsas ticarət / kommersiya kanalları

**artesian** [a:'ti:zjən] *adj* artezian; an ~ well artezian quyusu

**artful** ['a:tfl] *adj* 1. bic, hiyləgər, kələkbaz, fəndgir; cəld, diribaş, zirək, çevik; to be ~ bic / hiyləgər / kələkbaz / fəndgir olmaq; 2. qabil, mahir, məharətli, bacarıqlı, usta

**artfully** ['a:tfulı] *adv* ustalıqla, məharətlə; ~ made ustalıqla / məharətlə düzəldilmiş

**artfulness** ['a:tfulnıs] *n* biclik, hiyləgərlik, kələkbazlıq, fəndgirlik; diribaşlıq, zirəklik, cəldlik

**arthritic** [a:'θrıtık] *adj* 1. oynağa aid olan; 2. artrit, podaqra

**arthritis** [a:'θraıtıs] *n tib.* artrit *(oynaqların xəstəliyi)*, oynaqların soyuqlaması

**arthritism** ['a:θrıtızm] *n tib.* artritizm *(artrit xəstəliyinə tutulma meyli)*, podaqra

**article[1]** ['a:tıkl] *n* I 1. maddə, bənd, paraqraf; final ~ axırıncı maddə; 2. *pl* müqavilə, razılıq; saziş, razılaşma; to be under ~s müqavilə / saziş ilə bağlı olmaq; 3. məqalə; leading ~ baş məqalə *(qəzetdə)*; 4. şey, əşya; mal, cisim, maddə; ~s of daily necessity gündəlik tələbat şeyləri / malları; ~s of consumption gündəlik tələbat malları; saleable ~ tezsatılan mal / şey; unsaleable ~s pis satılan/çətin satılan mallar; taxed ~s vergi/rüsum qoyulan mallar; 5. *qram.* artikl; the indefinite ~ qeyri-müəyyənlik artikli; the definite ~ müəyyənlik artikli; 6. *zool., biol.* buğum *(bəzi heyvanlarda)*

**article** ['a:tıkl] *n* II maddə; *Article of 12 of the agreement states that... Sazişin 12-ci maddəsində deyilir ki,...*

**article[2]** ['a:tıkl] *v* ittiham etmək; ittihamın maddəsini irəli sürmək

**articulate[1]** [a:'tıkjulıt] *adj* 1. aydın, səhih, yaxşı anlaşılan, yaxşı başa düşülən; ~ speech aydın/səhih/yaxşı başa düşülən nitq; *The child is not very articulate Uşaq o qədər də aydın / səlis danışmır;* 2. yaxşı əsaslandırılmış; ~ argument yaxşı əsaslandırılmış dəlil / arqument

**articulate[2]** [a:'tıkjuleıt] *v* 1. aydın / dəqiq tələffüz etmək; *He articulates badly O, sözləri aydın tələffüz etmir;* 2. *fon.* artikulyasiya əmələ gətirmək *(nitq üzvlərini hərəkətə gətirməklə səslər çıxarmaq)*; 3. aydın / dəqiq ifadə etmək; 4. birləşmək, birləşdirilmək, bağlanmaq

**articulation[1]** [a:ˌtıkju'leıʃən] *n* 1. birləşdirmə, birləşdirilmə; bağlama, bağlanma; 2. birləşmə / birləşdirilmə qaydası; 3. dəqiq /aydın tələffüz; 4. *fon.* artikulyasiya *(müəyyən səs çıxartmaq üçün danışıq orqanlarının gördüyü iş)*; 5. *anat. zool.* oynaq, bənd, buğum; 6. *bot.* yarpağın budağa birləşdiyi yer; 7. *tex.* şarnir, həncamə; şarnirin oxu, şarnirin mərkəzi

**articulation[2]** [a:ˌtıkju'leıʃən] *adj:* ~ basis *fon.* artikulyasiya bazası

**artifact** ['a:tıfækt] *n arxeol.* qədim insanın maddi mədəniyyətinin qalıqları

**artifice** ['a:tıfıs] *n* ağıllı ixtira; uğurlu uydurma; hiylə; harmless/wicked ~ ziyansız/məkrli hiylə; ingenious ~ mahir/məharətli fırıldaq; to employ /to practise numerous ~s hər cür hiyləyə/kələyə əl atmaq; to make *smb.* do *smth.* by some ~ bir kəsi bicliklə bir şey etməyə məcbur etmək

**artificer** [a:'tıfısəʳ] *n* 1. peşəkar, sənətkar; 2.

orduda və ya donanmada mexanik; 3. ixtiraçı, icad edən; 4. topçu texnik; silah texniki

**artificial** [ˌa:tı'fıʃəl] *adj* 1. süni, qeyri-təbii; ~ **ice/silk** süni buz/ipək; ~ **butter** süni yağ, marqarin; ~ **fertilizer** süni gübrə; ~ **selection** *biol.* süni seçmə; ~ **pollination** *k.t.* süni tozlama; ~ **satellite** süni peyk; ~ **eye/denture** süni göz/diş, göz/diş protezi; ~ **respiration** süni nəfəs; ~ **feeding** süni yedirmə; ~ **limb** əl-ayaq protezi; 2. yalançı, hiyləgər, riyakar, süni, ikiüzlü, saxta; ~ **smile** yalançı/hiyləgər/riyakar /saxta təbəssüm;

◊ ~ **year** təqvim ili; ~ **person** hüquqi şəxs

**artificiality** [ˌa:tıfıʃı'ælıtı] *n* 1. sünilik, qeyri-təbiilk; 2. süni / qeyri-təbii olan şey

**artificialness** [ˌa:tı'fıʃəlnıs] *n* = **artificiality**

**artificials** [ˌa:tı'fıʃəlz] *n pl* 1. süni olan hər hansı bir şey; 2. *amer.* süni çiçəklər; 3. süni gübrə

**artillerist** [a:'tılərıst] *n* 1. topçu; 2. topçuluq / artilleriya üzrə mütəxəssis

**artillery** [a:'tılərı] *n* 1. artilleriya, topçuluq; **accompanying** ~ müşayiət artilleriyası *(yəni piyada qoşunu müdafiə edən)*; 2. topçular, topdan istifadə edən ordu hissəsi

**artilleryman** [a:'tılərımən] *n (pl* **-men** [-mən] topçu

**artisan** [ˌa:tı'zæn] *n* peşəkar, sənətkar, fəhlə *(fabrik-zavod fəhləsi)*

**artist** ['a:tıst] *n* 1. rəssam; 2. öz işinin ustası; ~ **in words** söz ustası; *He is no ordinary thief; he is an artist O, adi oğru deyil; öz işinin ustasıdır;* 3. artist

**artiste** [a:'tı:st] *n* estrada artisti; peşəkar / professional müğənni / rəqqas / aktyor

**artistic** [a:'tıstık] *adj* 1. gözəl, məharətli; 2. bədii; ~ **skill** bədii ustalıq

**artistical** [a:'tıstıkəl] *adj* = **artistic**

**artistically** [a:'tıstıkəlı] *adv* mahiranə, məharətlə, ustalıqla, bədii surətdə; **to do** *smth.* ~ bir şeyi məharətlə/ustalıqla etmək

**artistry** [a:'tıstrı] *n* 1. artistizm, yüksək sənətkarlıq, virtuozluq, ustalıq; *The artistry of the violinist charmed everybody Skripkaçının virtuozluğu hamını valeh etdi;* 2. rəssam sənəti, incəsənətlə məşğul olma

**artless** ['a:tlıs] *adj* 1. sadə, adi; ~ **grace** adi /təbii qəşənglik/zəriflik/məlahət; 2. sadədil, ürəyiaçıq, sadəlövh; **plain ~ people** adi sadədil adamlar; **an ~ village girl** sadədil kənd qızı; 3. kobud, pis düzəldilmiş; 4. bacarıqsız, məharətsiz, qabiliyyətsiz; **an ~ artist** bacarıqsız / qabiliyyətsiz rəssam

**artlessly** ['a:tlıslı] *adv* 1. sadəcə, sadəcə olaraq; saf ürəklə, hiyləsiz, ürəyiaçıqlıqla; *He admired it artlessly like a child O buna saf ürəklə uşaq kimi sevindi;* 2. bacarıqsız bir surətdə / tərzdə

**artlessness** ['a:tlısnıs] *n* təbiilik, sadəlik; sadədillik

**arts** [a:ts] *n* 1. humanitar elmlər; *History is an arts subject Tarix humanitar fənndir;* 2. sənət; **useful** ~ faydalı sənət

**arty** ['a:tı] *adj d.d.* qeyri-adi / çox qəribə dəbli, bədii görünən

**arty-and-crafty** ['a:tıənd'kra:ftı] *adj* iddialı, təşəxxüslü, lovğa

**-ary** [-ərı] *suff* I *ədəbi-kitab üslublu isimlərdə təsadüf edilir və aşağıdakı mənaları bildirir:* 1) şəxs, icraçı; revolution**ary** inqilabçı; function**ary** vəzifəli şəxs, məmur; vision**ary** xəyalpərəst, sufi, mistik; 2) əşya, şey; capill**ary** kapilyar *(ən kiçik qan damarı)*; document**ary** sənədli film

**-ary** [-ərı] *suff* II *ədəbi-kitab üslublu nisbi sifətlərdə təsadüf edilir:* fragment**ary** rabitəsiz, qırıq-qırıq, natamam; tradition**ary** ənənəvi, ənənəyə əsaslanan

**Aryan** ['eərıən] *n* ari *(millət adı)*; **the ~s** *top.i* arilər

**as**[1] *(tam forması* [æz], *qısa formaları* [əz, z]) *rel. pron. Təyin budaq cümləsini baş cümləyə bağlayır. Bu halda* **as** *Azərbaycan türkcəsinə* **kimi** *deyə tərcümə edilir; təyin budaq cümləli tabeli mürəkkəb cümlə dilimizə sadə geniş cümlə vasitəsi ilə tərcümə edilir. Məsələn, Use such examples as occur in the text Mətndə təsadüf edilən misallar kimisini işlət /işlədin; I don't like such books as he reads Onun oxuduğu kitablar kimi kitabı mən xoşlamıram*

**as**[2] *(tam forması* [æz], *qısa formaları* [əz, z]) *adv* 1. məsələn; *Some animals as the fox and the squirrel have bushy tails Bəzi heyvanların, məsələn, tülkünün və dələnin şələ quyruğu var;* 2. *müqayisə məqamında* **as…as** *şəklində işlənir və Azərbaycan türkcəsinə* **kimi** *sözü ilə tərcümə edilir; She is as pretty as her sister O, bacısı kimi qəşəngdir; inkar cümlələrdə* **not so… as** *də işlənə bilər; She is not so pretty as her sister O, bacısı kimi qəşəng deyil;* 3. eyni dərəcədə, eyni miqdarda; eyni, kimi; *Tom runs fast but I run just as fast Tom bərk qaçır, mən də onun kimi bərk qaçıram; Tom has a lot of money but I have as much Tomun çox pulu var, mənim də o qədər pulum var;* 4. **how, why** *sual sözlərinin qarşısında işlədilir: As how? Necə? As why? Nə üçün?* 5. *Aşağıdakı birləşmələrdə işlədilir:* ~ **for** gəldikdə, qaldı ki, … gəlincə…; *As for that book I don't like it Bu kitaba gəldikdə mən onu xoşlamıram;* ~ **to** 1) dair, haqqında, barəsində; *He said nothing as to wages O, əmək haqqı barədə/barəsində/haqqında heç nə demədi;* 2) gəldikdə, qaldı ki; *As to her, she can do whatever she likes Ona gəldikdə, o nə istəsə edə bilər;* ~ **follows** aşağıdakı kimi; *The terms are as follows Şərtlər aşağıdakı kimidir;* ~ **usual** adəti üzrə, qaydası üzrə, həmişə olduğu kimi; *She was late as usual O, adəti üzrə / hə-*



*mişə olduğu kimi gecikdi/gecikmişdi;* ~ **much** belə, bu cür, elə; *I thought as much Mən belə / bu cür fikirləşdim;* ~**well** 1) yaxşısı budur ki, yaxşı olar ki; *You may just as well stay Yaxşı olar ki, / Yaxşısı budur ki, sən / siz qalasan / qalasınız; We might as well begin at once Yaxşı olardı ki, biz dərhal başlayaq;* 2) həm də; *He takes English lessons on Mondays and Fridays as well Onun ingilis dili dərsi bazar ertəsi, həm də cümə günləri olur;* ~ **yet** hələ, hələ ki; *There has been no changes as yet hələ ki heç bir dəyişiklik olmayıb*

**as**[3] *(tam forması:* [æz], *qısa formaları* [əz,z]) *conj Bağlayıcı kimi aşağıdakı budaq cümlələrində işlədilir:* 1. *zaman budaq cümlələrdə:* -da, -də, vaxt, zaman; *As I was coming here I lost my key Mən bura gələndə / gələn vaxt / gələn zaman açarımı itirdim;* 2. *səbəb budaq cümlələrində:* indi ki, bir halda ki, madam ki; *As I am here I'd better stay Madam ki,/Bir halda ki, burdayam, yaxşısı budur ki, qalım; I shall not translate, as you know English Bir halda ki / İndi ki / Madam ki, sən/siz ingiliscə bilirsən, /bilirsiniz, mən tərcümə etməyəcəm;* 3. *tərzi-hərəkət cümlələrində:* kimi; *He will do as he likes O istədiyi kimi edəcək; They rose as one man Onlar bir adam kimi ayağa qalxdılar;* 4. *güzəşt budaq cümlələrində:* baxmayaraq (ki), hərçənd; *Tired as they were, they continued their way Yorğun olmalarına baxmayaraq, onlar yollarına davam etdilər*

**as … as** [æz.. æz] *conj* 1. *Müqayisə bildirir:* kimi, belə, elə, necə … elə; kimi, qədər; *He runs as fast as Tom O, Tom kimi bərk qaçır; Is it as interesting as that? Məgər bu onun kimi maraqlıdır? He speaks English as easily as he speaks French O, ingiliscə necə asan danışırsa, fransızca da elə danışır; He is as capable as his father O, atası kimi bacarıqlıdır; She ran as fast as possible O bacardığı qədər bərk qaçdı;* 2. *Aşağıdakı birləşmələrdə işlədilir:* 1) ~ **far** ~ kimi, qədər; *We walked as far as the post-office Biz poçta qədər / kimi getdik; I shall help her as far as I can Mən ona bacardığım qədər kömək edəcəm;* 2) ~ **far back** ~ hələ; *As far back as three years ago Hələ üç il bundan qabaq/əvvəl;* 3) ~ **good** ~ əslində, faktiki olaraq; *The case is as good as lost Məsələ əslində / faktiki olaraq uduzulub;* 4) ~ **long** ~ qədər; bir halda ki; bu şərtlə ki; *You may keep the book as long as you need it Kitabı istədiyin / istədiyiniz qədər saxlaya bilərsən / bilərsiniz, Kitabı lazım olan qədər saxlaya bilərsən / bilərsiniz; As long as you apologize I'm satisfied Bir halda ki, sən/siz üzr istəyirsən/istəyirsiniz, bu mənə kifayətdir; I will lend you the book as long as you keep it clean Mən bu kitabı sənə /sizə verərəm, bu şərtlə ki, onu təmiz saxlayasan / saxlayasınız;* 5) ~ **much** ~ nə qədər… o qədər; *Take as much as you like Nə qədər istəyirsən/istəyirsiniz, o qədər götür/ götürün;* 6) ~ **soon** ~ kimi; *As soon as he came in O, içəri girən kimi;* 7) ~ **well** ~ yanaşı, bərabər; *There was a chair as well as a table in the room Otaqda stulla bərabər/yanaşı stol da vardı; He gave me advice as well as money O mənə məsləhətlə yanaşı / bərabər pul da verdi;* **by day ~ well ~ by night** təkcə gündüz yox, həm də gecə, həm gündüz, həm də gecə

**asbestos** [æz'bestɔs] *n* asbest *(odadavamlı lifli mineral)*

**ascend** [ə'send] *v* 1. qalxmaq; çıxmaq; **to ~ a mountain** dağa qalxmaq; **to ~ the throne** taxta çıxmaq; *The mist ascended from the valley Dərədən duman qalxdı;* 2. yüksəlmək *(vəzifədə və s.)*; **to ~ to the climax of** *one's* **glory** şöhrətin zirvəsinə yüksəlmək; 3. *astr.* çıxmaq, doğmaq *(günəş və s.);* 4. *av.* yuxarı qalxmaq

**ascendancy** [ə'sendənsı] *n* hakimiyyət; ixtiyar; hökmranlıq, ağalıq; **to have ~ over** *smb.* bir kəs üzərində hökmranlıq / ağalıq etmək

**ascendant**[1] [ə'sendənt] *n* 1. ağalıq, hakimiyyət, üstünlük; **to be in the ~** hakim olmaq, ağalıq /hökmranlıq etmək; böyük nüfuzu/təsiri olmaq; 2. ulduzların cədvəli; ulduz falı, nücum falı *(orta əsrlərdə)*; 3. əcdad, ulu baba

**ascendant**[2] [ə'sendənt] *adj* 1. qalxan, yüksələn, doğan, çıxan; ~ **venus** *astr.* doğan/ qalxan /yüksələn Venera /Zöhrə ulduzu; 2. hakim, üstün, hökmran; ağalıq edən, hökmranlıq edən; ~ **position** hakim / üstün vəziyyət

**ascendency** [ə'sendənsı] *n* = **ascendancy**

**ascendent**[1] [ə'sendənt] *n* = **ascendant**[1]

**ascendent**[2] [ə'sendənt] *adj* = **ascendant**[2]

**ascending** [ə'sendıŋ] *adj* 1.qalxan, yüksələn; 2. nəsildə ata-babadan yüksələn xətt; ~ **scale** yüksələn qamma

**ascension** [ə'senʃn] *n* 1. qalxma, çıxma; yüksəlmə; 2. gəlmə *(hakimiyyətə)*; ~ **to the throne** taxta çıxma; 3. *astr.* çıxma, göy cisimlərinin üfüqdə görünməsi

**ascensional** [ə'senʃənl] *adj* 1. qalxan, yüksələn; doğan, çıxan; 2. qaldırıcı; ~ **power** *av.* qaldırıcı qüvvə

**ascent** [ə'sent] *n* 1. qalxma, çıxma; yüksəlmə; **to make an ~ of a mountain** dağa qalxmaq / çıxmaq; *The ascent of the mountain was not difficult Dağa qalxmaq / çıxmaq çətin olmadı;* **to make an ~ of the stairs** pilləkənlərlə yuxarı qalxmaq / çıxmaq; **to make an ~ of the river** çay boyu yuxarı getmək; **the ~ of vapours from the earth** torpaqdan buxarın qalxması; **the ~ of man from his original state to modern civilization** insanın ilk vəziyyətdən müasir sivilizasiyaya yüksəlməsi; 2. yoxuş, yuxarı qalxan yol, diklik; sıldırım; **rapid** ~ sərt diklik / yoxuş; 3. irəliləmə *(vəzifədə və s.)*

**ascertain** [ˌæsə'teın] *v* müəyyənləşdirmək, müəyyən/təyin etmək; aşkar etmək; sübut etmək;

to ~ ***smb.'s* address** bir kəsin ünvanını müəyyənləşdirmək /müəyyən etmək; **to ~ the facts** dəlilləri müəyyən etmək; **to ~ what really happened** əslində nə baş verdiyini müəyyənləşdirmək; *I ascertained that he was dead Mən müəyyən etdim ki, o ölüb;* **to ~ *smb.'s* guilt** bir kəsin günahını müəyyənləşdirmək / müəyyən etmək

**ascertainment** [ˌæsə'teınmənt] *n* müəyyənləşdirmə, müəyyən etmə, təyin etmə; **~ of facts** faktların / dəlillərin müəyyən edilməsi / müəyyənləşdirilməsi/dəqiqləşdirilməsi

**ascetic**[1] [ə'setık] *n* asket, tərki-dünya, zahid; adamayovuşmaz, adamdanqaçan

**ascetic**[2] [ə'setık] *adj* **1.** asketik, **2.** nəfsini saxlayan, özünü saxlayan, çəkinən *(əsas. dini məsələlərdə)*

**ascetical** [ə'setıkəl] *adj* = **ascetic**[2]

**ascetically** [ə'setıkəlı] *adv* asketcəsinə, zahidcəsinə, asket kimi, zahid kimi

**asceticism** [ə'setısızm] *n* asketizm, zahidlik, dünya ləzzətindən əl çəkmə

**ascorbic acid** [əs'kɔ:bık'æsıd] *n əcz; kim.* askorbin turşusu *(C vitamini)*

**ascribe** [əs'kraıb] *v* **1.** aid etmək, istinad etmək, ayağına yazmaq, adına çıxmaq; izah etmək; **to ~ a quality to *smb.*** keyfiyyəti bir kəsə aid etmək/bir kəsin ayağına yazmaq; *This play is sometimes ascribed to Shakespeare Bu pyes bəzən Şekspirin adına yazılır/Şekspirə aid edilir; No one knows who wrote this poem, but it is usually ascribed to Vagif Heç kəs bilmir, bu şeri kim yazıb, lakin adətən onu Vaqifin adına çıxırlar;* **2.** hesab etmək, hesabına yazmaq; *Her death was ascribed to poison Onun zəhərdən öldüyünü zənn edirlər, Onun zəhərdən öldüyünü deyirlər*

**ascription** [əs'krıpʃn] *n* aid / istinad etmə, ayağına yazma; *The ascription of their failure to lack of money is not convincing Onların uğursuzluğunu pulun çatışmazlığına aid etmə inandırıcı deyil*

**asepsis** [æ'sepsıs] *n tib.* aseptika *(yaranı mikrobdan qorumaq üçün ona toxunacaq şeyləri kimyəvi vasitələrlə dezinfeksiya etmə)*

**asexual** [æ'sekʃuəl, æ'seksjuəl] *adj* **1.** cinsiyyətsiz *(erkəklik və ya dişilik əlaməti olmayan);* **2.** seksə həvəs göstərməyən, cinsi əlaqəyə laqeyd olan; **3.** *biol.* vegetativ

**ash** [æʃ] *n* I *bot.* göyrüş, vən

**ash** [æʃ] *n* II **1.** kül; **a heap of ~(es)** kül topası; **to lay/to burn/to reduce to ~es** yandırıb külə döndərmək; *The house was burnt to ashes Ev yanıb külə döndü;* **2.** *pl* meyit yandırıldıqdan sonra qalan kül; *Her ashes were scattered over the sea Onun külünü dənizə səpdilər;* **3.** kül rəngi;

◊ **to turn to dust and ~es** puça çıxmaq *(ümid haq.);* **to bring back the ~es** uduzduqlarını qaytarmaq *(kriket oyununda)*

**ashame** [ə'ʃeım] *v* utandırmaq, qızartmaq; xəcalət vermək; rüsvay / biabır etmək

**ashamed** [ə'ʃeımd] *adj* utancaqlıq hissi keçirən, xəcalət çəkən, xəcalətli; **to be / to feel ~ of *smth.*** bir şeyə görə utanmaq /xəcalət çəkmək; **to feel ~ for *smb.*** bir kəsə görə utanmaq / xəcalət çəkmək; *I am ashamed to confess Etiraf etməyə utanıram /xəcalət çəkirəm;* **to make *smb.* ~** bir kəsi utandırmaq /qızartmaq; *You ought to be ashamed of yourself Sən/Siz gərək xəcalət çəkəsən / çəkəsiniz; You should be ashamed to tell such lies Sən / Siz belə yalan danışdığına / danışdığınıza görə utanmalısan / utanmalısınız*

**ashberry** ['æʃberı] *n bot.* üvəz, quşarmudu *(giləmeyvə)*

**ash-bin** ['æʃbın] *n* **1.** zibil üçün qutu/yeşik; **2.** *tex.* küllük

**ash-box** ['æʃbɔks] *n* küllük; küllü əhəng məhlulu; külbə, dəmkeş

**ash-cake** ['æʃkeık] *n amer.* küllü kömbə, küldə bişirilmiş kömbə / kökə

**ash-can** ['æʃkæn] *n* = **ash-bin**

**ashen** ['æʃn] *adj* I **1.** kül; küldən; **2.** kül rəngli; külü rəng; ölü rəngində; *His ashen face showed how shocked he was Onu ölü rəngində sifəti göstərdi ki, o necə sarsıntı keçirib*

**ashen** ['æʃn] *adj* II göyrüş; **~ leaf** göyrüş yarpağı

**ashery** ['æʃərı] *n* **1.** *tex.* küllü əhəng məhlulu; **2.** potaş istehsal edən müəssisə

**ashlar** ['æʃlə] *n tik.* **1.** yonulmuş daş; **2.** yonulmuş daşdan hörgü; **~ facing** yonulmuş daşdan üz çəkmə

**ashling** ['æʃlıŋ] *n* cavan göyrüş ağacı

**ashman** ['æʃmən] *n (pl* **-men** [mən] *amer.* zibilçi, zibilyığan, zibildaşıyan

**ashore** [ə'ʃɔ:] *adv* **1.** sahilə; **to go/to come ~** sahilə çıxmaq; **to run / to be driven ~** lilə batmaq; **2.** sahildə, quruda

**ash-tray** ['æʃtreı] *n* külqabı

**ashy** ['æʃı] *adj* **1.** kül; küldən; **2.** kül rəngi; **3.** solğun, rəngi qaçmış, rəngi ağarmış

**Asian** ['eıʃn, 'eıʒn] *n* asiyalı, asiyalı qadın/ qız

**Asiatic**[1] [ˌeıʃı'ætık] *n* = **Asian**

**Asiatic**[2] [ˌeıʃı'ætık] *adj* Asiya; **~ states** Asiya dövlətləri

**aside**[1] [ə'saıd] *n* **1.** aktyorun səhnədə kənara dediyi sözlər; **2.** ikinci dərəcəli hadisələr; **the ~s of the history** tarixin ikinci dərəcəli hadisələri

**aside**[2] [ə'saıd] *adv* **1.** kənara, qırağa; *Step aside! Kənara dur/durun! İcazə ver/verin keçim!* **to take *smb.* ~** bir kəsi kənara çəkmək *(danışmaq üçün); She drew the curtain aside O, pərdəni kənara çəkdi; He stood aside O, qırağda dayandı;* **2.** yığma, qırağa qoyma, təxirə salma; **to put / to set money ~** qırağa / kənara pul qoymaq; *I have put some money aside Mən kənara bir az pul qoymuşam; She laid aside her work during the holidays Məzuniyyət günlərində o, işini kənara qoydu /təxirə saldı; When spring comes, she puts aside her winter clothes Yaz gələndə o, qış paltarlarını yığışdırır/kənara qoyur;* **to lay ~ bad habits** pis adətlərdən imtina etmək /əl çəkmək; *Put aside gloomy thoughts Pis fikirləri başından /başınızdan çıxar/çıxarın;* **to put ~ a verdict/a judgement** *hüq.* hökmü/qərarı ləğv etmək; *Joking aside Zarafatsız, Zarafat bir yana qalsın;*

◊ **to speak ~** kənara danışmaq *(aktyor haq.)*



**as if** [æz'ıf] *conj* **1.** elə ... ki, ...elə bil; *He looks as if he had been seriously ill O elə görünür ki, elə bil ağır xəstəlikdən qalxıb /durub; He fought as if his life was / were in danger O elə vuruşdu ki, elə bil həyatı təhlükədə idi; He shook his head as if (he wanted) to say "No" O, başını elə yırğaladı ki, elə bil "Yox! demək istəyirdi; It looks as if it may rain Elə görünür ki / Elə bil yağış yağacaq;* **2.** adama elə gəlir ki; *It seemed as if the night would never end Adama elə gəlirdi ki, gecə heç vaxt qurtarmayacaq; It seems as if he is seriously ill Adama elə gəlir ki, o, ciddi xəstədir;* **3.** *Nida cümlələrində işlədilir:* guya; *As if you didn't know him! Guya sən / siz onu tanımırsan / tanımırsınız!*

**asinine** ['æsınaın] *adj* gic, axmaq, sarsaq; **an ~ remark** gic/axmaq irad; *What an asinine remark! Bu nə axmaq iraddır!*

**asininity** [ˌæsı'nıtı] *n* axmaqlıq, sarsaqlıq, səfehlik, ağılsızlıq, giclik

**ask** [a:sk] *v* **1.** soruşmaq; xəbər almaq; **to ~ a question** sual vermək; **to ~ the way** yolu soruşmaq; **to ~ the time** vaxtı soruşmaq; *Did you ask the price? Qiyməti soruşdunmu?/soruşdunuzmu? She asked me about my work O məndən işim haqqında soruşdu; Ask her name Onun adını soruş/soruşun; You must ask if you want to know smth. Bir şeyi bilmək istəyirsənsə/istəyirsinizsə, soruşmalısan /soruşmalısınız;* **to ~ after *smb.'s* health** bir kəsin səhhəti barədə/haqda soruşmaq; *Has anybody asked for me? Bir kəs məni soruşubmu?;* **2.** xahiş etmək, kömək istəmək; **to ~ for help/for money** kömək /pul istəmək; **to ~ *smth.* of / from *smb.*** bir kəsdən bir şey istəmək; **3.** icazə istəmək; *He asked to speak O, danışmaq üçün icazə istədi;* **4.** tələb etmək; **to ~ (for) complete obedience** tam tabe olmağı tələb etmək; **5.** dəvət etmək; **to ~ *smb.* to dinner** bir kəsi nahara dəvət etmək; **to ~ *smb.* in** bir kəsi içəri dəvət etmək;

◊ *Ask me another amer. Bilmirəm, soruşmayın; Ask no questions and you will be told no lies at söz.* ≅ *Sual vermə ki, sənə/sizə yalan deməsinlər*

**askance** [əs'kæns] *adv* **1.** əyri, çəp, çəpəki, çəpinə, köndələn; əyri-əyri; **to eye ~ at *smb.*** bir kəsə çəpəki/əyri-əyri baxmaq; *She looked askance at me, She looked at me askance O mənə əyri-əyri baxdı;* **2.** şübhəli, şübhəli-şübhəli; *The girl looked at the dirty man askance Qız üst-başı çirkli kişiyə şübhəli-şübhəli baxdı*

**askew**[1] [əs'kju:] *adj* əyri, çəp, çəpəki

**askew**[2] [əs'kju:] *adv* əyri, çəp, çəpəki; yanakı; *The blinds are hanging askew Pəncərənin pərdələri əyri asılıb; He wears his hat askew O, papağını çəpəki / yanakı qoyur*

**aslant**[1] [ə'sla:nt] *adv* maili, çəpəki, çəpinə; *The rain was falling aslant Yağış çəp / çəpəki / çəpinə yağırdı*

**aslant**[2] [ə'sla:nt] *prep* köndələninə, çəpinə, çəpəki; *The car stood aslant the track Maşın yolda köndələninə dayanmışdı*

**asleep** [ə'slı:p] *adj* **1.** yatan; **fast /sound ~** bərk yatan; **to be ~** yatmaq, yatmış vəziyyətdə olmaq; **to fall ~** yuxuya getmək, yatmaq; *He was asleep O yatmışdı;* **to lull a child ~** uşağı yırğalayıb yatırtmaq; **2.** küt, ölgün, süst; **3.** keyləşmiş, keyimiş *(əl, ayaq və s. haq.)*

**a-smoke** [ə'smouk] *adv* tüstüdə, tüstü içində

**asocial** [ə'souʃəl] *adj* cəmiyyətin hüquqlarını və marağını pozan

**asp** [æsp] *n* I *bot.* ağcaqovaq

**asp** [æsp] *n* II **1.** *zool.* gürzə; **2.** aspid *(zəhərli ilan);* **3.** *d.d.* ilan; *Cleopatra was bitten by an asp Kleopatranı gürzə dişlədi / çaldı*

**asparagus** [əs'pærəgəs] *n bot.* qulançar, mərəçüyüd, quşqonmaz

**aspect** ['æspekt] *n* **1.** xarici görkəm, üz-gözün ifadəsi; **to have/to bear an ~** görkəmi olmaq, görkəmə malik olmaq; *We became afraid of the angry aspect of the man Biz kişinin acıqlı görkəmindən qorxduq;* **2.** baxış, nöqteyi-nəzər; cəhət; **to view the matter in/under this ~** məsələyə bu baxımdan /bu cəhətdən baxmaq, məsələni bu baxımdan müzakirə etmək; **3.** tərəf; **the eastern ~ of the house** evin şərq / quzey tərəfi; **4.** *pl.* perspektiv; **economic ~s** iqtisadi perspektivlər; **5.** *qram.* tərz; **~ of the verb** felin tərzi; **continuous ~** davamedici tərz

**aspectual** [æ'spektʃuəl] *adj qram.* növ, tərz

**aspen**[1] ['æspən] *n* = **asp** I

**aspen**[2] ['æspən] *adj* ağcaqovaq; **an ~ leaf** ağcaqovaq yarpağı;

◊ **to quake / to tremble like an ~ leaf** ağcaqovaq yarpağı kimi əsmək / titrəmək

**asperity** [æs'perıtı] *n* **1.** əyri-üyrülük, kələ-kötürlük, nahamarlıq, kələ-kötür/nahamar/əyri-üyrü yer; **asperities of the moon** ay səthinin kələ-kötürlüyü / nahamarlığı; **2.** kobudluq, qabalıq; kəskinlik *(xasiyyət haq.);* **3.** *arx.* kəskinlik, qabalıq *(səs tonu haq.);* **to speak with ~** kəskin danışmaq; **4.** sərtlik, şiddət *(ab-hava haq.);* **5.** çətinlik, məhrumiyyət; **asperities of a cold winter** soyuq / sərt qışın çətinlikləri; *We suffered the asperity of a northern winter Biz şimal qışının əzablarını çəkdik*

**asperse** [əs'pə:s] *v* 1. biabır etmək, şər atmaq; ləkələmək, bədnam etmək; **to ~ *smb.'s* name** bir kəsin adını ləkələmək, bir kəsi bədnam etmək; 2. **(with)** çiləmək, səpmək, sıçratmaq

**aspersion** [əs'pə:ʃn] *n* böhtan, söyüş; **to cast ~s on/upon *smb.'s* character** bir kəsə böhtan atmaq

**asphalt**[1] ['æsfælt] *n* 1. asfalt; 2. bitum

**asphalt**[2] ['æsfælt] *v* asfaltlamaq, asfalt döşəmək / tökmək/salmaq

**asphaltic** [æs'fæltık] *adj* asfaltlı, asfalt

**asphaltum** [æs'fæltəm] *n* = **asphalt**[1]

**asphyxia** [æs'fıksıə] *n tib.* təngnəfəslik, nəfəs tutulması, təngişmə

**asphyxiant**[1] [æs'fıksıənt] *n* boğucu zəhərləyici maddə

**asphyxiant**[2] [æs'fiksıənt] *adj* boğucu; **~ gas** boğucu qaz

**asphyxiate** [æs'fıksıeıt] *v* 1. boğmaq; 2. *The men in the coalmine were asphyxiated by bad gas Adamlar kömür şaxtasında pis qazdan boğulmuşlar; I was almost asphyxiated by the fumes Mən az qala tüstüdən boğulmuşdum*

**asphyxiator** [æs'fıksıeıtəʳ] *n* odsöndürən *(şaxtada)*

**asphyxy** [æs'fıksı] *n* = **asphyxia**

**aspic** ['æspık] *n* I şirə gəzdirilmiş yemək *(bərk bişirilmiş ət, balıq və s.-dən hazırlanmış yemək)*

**aspic** ['æspık] *n* II *bot.* lavanda *(tünd-göy rəngli çiçəyi olan kəskin iyli yarımkol bitki)*

**aspirant**[1] [əs'paıərənt] *n* iddiaçı, iddia edən, tələb edən, namizəd; *There are many aspirants for/after the president's job Prezidentliyə çoxlu namizəd var*

**aspirant**[2] [əs'paıərənt] *adj* can atan, səy göstərən *(bir şeyə)*

**aspirate**[1] ['æspıreıt] *n fon.* aspirat, nəfəsli səs; [h] *is an aspirate* [h] *nəfəsli səsdir*

**aspirate**[2] ['æspıreıt] *v* 1. nəfəsli tələffüz etmək **(as in *human* human** *sözündə olduğu kimi)*; 2. *tex.* sormaq; 3. *tib.* sorub çıxarmaq *(mayeni, qazı, irini)*

**aspiration** [,æspə'reıʃn] *n* 1. cəhd, can atma, güclü arzu / meyl; təşəbbüs; 2. *fon.* nəfəsli səs, aspirat; 3. *tib.* hər hansı bir boşluqdan mayeni, irini *və s.* sorub çıxarma; 4. nəfəs alma, nəfəs çəkmə

**aspirator** ['æspəreıtəʳ] *n* aspirator *(hava, qaz, toz və sairəni sormaq üçün cihaz)*

**aspire** [əs'paıəʳ] *v* 1. can atmaq, cəhd göstərmək, cəhd etmək, əlləşmək, çalışmaq; **to ~ to honours /to riches** şərəfə / var-dövlətə can atmaq / cəhd göstərmək; **to ~ after glory** şərəfə / şöhrətə can atmaq; *He aspired after knowledge O, elmə can atdı / cəhd etdi; He aspired to become president O, prezident olmağa can atdı/cəhd göstərdi;* 2. *arx. şair.* yüksəlmək, qalxmaq, ucalmaq

**aspirin** ['æspərın] *n əcz.* 1. aspirin; 2. aspirin həbi; **to take two ~s** iki həb aspirin qəbul etmək; *Take two aspirins İki həb aspirin qəbul et /edin*

**aspiring**[1] [əs'paıərıŋ] *n* cəhd, can atma, arzu, meyl

**aspiring**[2] [əs'paıərıŋ] *adj* 1. şöhrətpərəst; 2. *arx. şair.* qalxan, yüksələn

**asquint** [ə'skwınt] *adv* çəp, çəpəki, çəpinə, kəndələn; **to look ~ 1)** çəp/çəpəki baxmaq; **2)** əyri-əyri / şübhəli baxmaq

**ass**[1] [æs] *n* 1. *zool.* eşşək, uzunqulaq; 2. səfeh /sarsaq /ağılsız /axmaq adam; 3. *amer. tab.* bax **arse** *(1-ci mənada)*;
◊ **to act / to play the ~** özünü eşşək yerinə /gicliyə qoymaq; **to make an ~ of oneself / of *smb.*** özünü / bir kəsi axmaq yerinə qoymaq; **to be an ~ for *one's* pains** aldanmaq, gic vəziyyətdə qalmaq; **~ in grain** gic, axmaq, kütbeyin, *Never bray at an ass ≅ Axmağa /Gicə qoşulma;* **a bit of ~ 1)** *amer. tab.* qız, **2)** cinsi əlaqə

**ass**[2] [æs] *v kob.* eşşəklik etmək; eşşək kimi hərəkət etmək/davranmaq; *Don't ass! Eşşəklik etmə/etməyin!*

**assail** [ə'seıl] *v* 1. hücum etmək, hücuma keçmək, qəfildən hücuma atılmaq; *The army assailed the town Ordu şəhərə hücum etdi; The fortress was assailed on all sides Qalaya hər tərəfdən hücum edildi; We were assailed by a violent hail-storm Biz dəhşətli dolu tufanına düşdük;* 2. *məc.* yağdırmaq, basmaq; **to ~ a speaker with questions** natiqi suala basmaq, natiqə sual yağdırmaq; *He was assailed with questions Ona sual yağdırdılar, Onu suala basdılar;* 3. kəskin tənqid etmək; istehza etmək, lağa qoymaq, masqaraya qoymaq, rişxənd etmək; **to ~ *smb.* with epigrams** bir kəsi həcv ilə lağa qoymaq, bir kəsə həcv vasitəsilə rişxənd etmək; 4. həvəslə/hərarətlə işə başlamaq, üstünə düşmək *(işin)*

**assailant** [ə'seılənt] *n* 1. hücumçu, hücum edən, düşmən; *I didn't see the face of my assailant Mən mənə hücum edənin üzünü görmədim;* 2. düşmənçilik mövqeyində olan tənqidçi

**assassin** [ə'sæsın] *n* 1. siyasi və ya ictimai xadimi qətlə yetirmə; 2. muzdla tutulmuş qatil

**assassinate** [ə'sæsıneıt] *v* 1. siyasi motivə görə qətlə yetirmək; 2. xaincəsinə/namərdcəsinə öldürmək

**assassination** [ə,sæsı'neıʃn] *n* 1. siyasi motivə görə qətl; 2. xaincəsinə /qəsdən qətl

**assassinator** [ə'sæsıneıtəʳ] *n* = **assassin**

**assault**[1] [ə'sɔ:lt] *n* 1. hücum, həmlə; **to make an ~ upon *smb.*** bir kəsə hücum etmək; **to make an ~ upon a fortress** qalaya hücum etmək; **to take a fortress by ~** qalanı hücumla almaq; **to repulse / to repel an ~** hücumu/həmləni dəf etmək; **to withstand an ~** hücuma / həmləyə tab gətirmək; 2. kəskin çıxış, hücum *(bir kəsə qarşı)*; **~s upon the constitution** konstitusiyaya /anayasaya qarşı kəskin çıxış etmə; 3. *hüq.* **1)** sözlə təhqir və hədə gəlmə; **to commit an ~ upon *smb.*** bir kəsi hərəkətlə təhqir etmək; **2)** *evf.* zorlama, zorlanma



**assault**[2] [ə'sɔ:lt] *v* 1. qəfildən hücum/həmlə etmək; **to ~ a city / a fortress** şəhərə / qalaya qəfildən hücum etmək; 2. kəskin /kobud /xoşagəlməyən bir tərzdə hərəkət etmək; *The cries assaulted her ears Səs-küy onun qulağını batırdı;* 3. kəskin hücum/tənqid etmək; **to ~ *smb.'s* reputation** bir kəsin nüfuzunu korlamaq/qırmaq /salmaq; 4. *hüq.* fiziki güclə təhdid etmək; 5. zorlamaq

**assay**[1] [ə'seı] *n* 1. sınama, yoxlama, sınaqdan keçirmə, təcrübədən çıxartma; 2. nümunə *(analiz üçün)*

**assay**[2] [ə'seı] *v* 1. təhlil/analiz etmək *(tərkibində metal olan torpağın, qızıl üzüyün və s. tərkibini müəyyən etmək üçün)*; 2. *arx.* sınamaq, yoxlamaq, cəhd göstərmək/etmək; **to ~ the impossible** mümkün olmayan bir işə cəhd göstərmək/etmək

**assayer** [ə'seıəʳ] *n* probvuran *(usta)*; kimyaçı-laborant

**assay-master** [ə'seı,ma:stəʳ] *n* probvuran *(usta)*

**assemblage** [ə'semblıdʒ] *n* 1. toplantı, toplanış; yığım, yığılma; **an ~ of all ages and nations** bütün yaşlardan və millətlərdən olan adamların toplantısı; 2. kolleksiya *(şeylərin müəyyən sistem üzrə toplanması)*; 3. *tex.* quraşdırma, quraşdırılma, montaj; 4. *geol.* formasiya *(bir dövrün geoloji çöküntülər təbəqələrinin məcmusu)*; 5. birlik, ittifaq, cəmiyyət; yığın, bir yerə yığışma, toplanma

**assemble** [ə'sembl] *v* 1. toplamaq, yığmaq, toplanmaq, yığışmaq; çağırmaq, dəvət etmək; **to ~ friends** dostları bir yerə yığmaq; **to ~ pupils** şagirdləri toplamaq/yığmaq; **to ~ an audience** dinləyiciləri toplamaq; *The parliament has assembled Parlament toplandı/yığışdı; The pupils assembled in the school hall Şagirdlər məktəbin zalına toplaşdılar;* 2. cərgəyə düzmək, cərgə ilə yığmaq/düzmək; *The books are assembled on the shelves in alphabetical order Kitablar rəflərə əlifba sırası üzrə düzülüb/yığılıb;* 3. *tex.* yığmaq, quraşdırmaq; **to ~ a car** maşın yığmaq / quraşdırmaq; 4. *kino* montaj etmək; 5. tərtib etmək; **to ~ a book** kitab tərtib etmək

**assembling** [ə'semblıŋ] *n* quraşdırma, quraşdırılma, montaj, qurğu, mexanizm

**assembly**[1] [ə'semblı] *n* 1. toplanış, yığıncaq, iclas; cəmiyyət; **~ of stockholders** aksionerlərin cəmiyyəti; **the Legislative Assembly** Qanunvericilik məclisi; **the school ~** məktəb toplantısı / yığıncağı; 2. məclis, iclas; **constituent ~** təsis/təsisedici iclas/yığıncaq; **United Nation General Assembly** Birləşmiş Millətlər Təşkilatının Baş Məclisi; **to convoke/to summon an ~** iclas çağırmaq; **to hold an ~** iclas keçirmək; 3. *tex.* **1)** kompleks, dəst; **2)** aqreqat *(bir iş görmək üçün bir neçə müxtəlif maşın birləşməsindən ibarət qurğu)*; 4. *tex.* montaj, quraşdırma, quraşdırılma; 5. *hərb.* **1)** yığışmaq / toplaşmaq üçün baraban və ya şeypurla verilən siqnal; **2)** bir yerə toplaşma / cəmləşmə

**assembly**[2] [ə'semblı] *adj* montaj, quraşdırma; **~ drawing** montaj sxemi; **~ shop / plant** quraşdırma sexi/zavodu; **~ line** *tex.* quraşdırma konveyer xətti; **~ point** *hərb.* toplanış / toplanma məntəqəsi

**assemblyman** [ə'semblımən] *n (pl.* **-men** [-mən]) qanunvericilik məclisinin üzvü

**assembly-room** [ə'semblıru:m] *n* konsert, bal və s. üçün zal; 2. *tex.* quraşdırma sexi

**assent**[1] [ə'sent] *n* razılıq; **silent ~** dinmədən razılıq; **to give *one's* ~ to a plan** plana razılığını vermək, planla razılaşmaq, planı bəyənmək; **to nod ~** razılıq əlaməti olaraq başını yırğalamaq; *I won't assent to his plan Mən onun planına razılıq verməyəcəm*

**assent**[2] [ə'sent] *v* 1. razı olmaq, razılaşmaq; **to ~ to a proposal** təkliflə razılaşmaq; **to ~ by a nod** başını yırğalamaqla razılığını bildirmək; **to ~ with reluctance** könülsüz olaraq razılaşmaq; 2. güzəşt etmək, güzəştə getmək; **to ~ to request** xahişə güzəştə getmək

**assert** [ə'sə:t] *v* 1. müdafiə etmək, qorumaq; **to ~ *one's* rights** öz hüquqlarını müdafiə etmək /qorumaq; *She asserted her right O öz hüquqlarını müdafiə etdi;* 2. təsdiq etmək; isbat etmək, əsaslandırmaq; bəyan etmək; *She asserted her ideas loudly and clearly O öz fikirlərini ucadan və aydınlıqla bəyan etdi; His friends asserted that he was innocent Onun dostları isbat etdilər ki, o, günahsızdır;* 3. *hüq.* iddia / tələb irəli sürmək; **to ~ oneself** həddən artıq / çox böyük iddia irəli sürmək

**assertion** [ə'sə:ʃn] *n* 1. təsdiq etmə, təsdiqlənmə, təsdiqləmə; **mere ~** əsassız / dəlilsiz / sübutsuz təsdiq etmə; 2. *hüq.* bəyanat, məlumat; iddia

**assertive** [ə'sə:tıv] *adj* 1. təsdiq; **in an ~ form** təsdiq formada; 2. həddən artıq inadlı /təkidli /israrlı, sözünün üstündə duran; özünə qürrələnən/güvənən / inanan; lovğa, qətiyyətli; **~ tone** qətiyyətli ton; **~ manner** qətiyyətli davranış; *He is very assertive O çox qətiyyətlidir*

**assertively** [ə'sə:tıvlı] *adv* inadla, inadlı tərzdə, təkidliliklə, qətiyyətlə

**assertiveness** [ə'sə:tıvnıs] *n* israrlılıq, inadlılıq, təkidlilik

**assess** [ə'ses] *v* 1. cərimənin və ya verginin miqdarını müəyyənləşdirmək; 2. vergi almaq üçün əmlakın qiymətini müəyyənləşdirmək; 3. vergi qoymaq, cərimə müəyyənləşdirmək; **to ~ taxes** verginin miqdarını müəyyənləşdirmək; **to ~ the damage caused by a storm** tufanın vurduğu ziyanı müəyyənləşdirmək; 4. ziyanın miq-

yasını müəyyənləşdirmək; 5. qiymətləndirmək, dəyərləndirmək; *His work was assessed at its true worth Onun işi lazımınca dəyərləndirildi/qiymətləndirildi*
**assessable** [ə'sesəbl] *adj* vergi qoyula bilən, vergi qoyulmalı; qiymət qoyula bilən, qiymətləndirilən
**assessment** [ə'sesmənt] *n* 1. vergi almaq üçün əmlakın qiyməti; 2. vergi qoyma; 3. verginin həcmi; 4. qiymət, rəy, mühakimə
**assessor** [ə'sesəʳ] *n* 1. vergi məmuru; 2. ekspert *(konsultant)*
**asset** ['æset] *n* 1. müəyyən dəyəri olan və borcları ödəmək üçün satıla bilən əmlak; **personal/real ~s** daşınmaz/daşınan əmlak; 2. *pl mal.* aktiv *(müəssisə balansının bütün material vəsaiti və borc tələblərini göstərən hissəsi)*; **~s and liabilities** aktiv və passiv *(müəssisənin bütün borc və təəhhüdlərinin məcmusu)*; 3. qiymətli keyfiyyət; *Health is a great asset Sağlamlıq böyük nemətdir*
**asseverate** [ə'sevəreıt] *v* təntənəli surətdə elan etmək / bəyan etmək
**asseveration** [ə͵sevə'reıʃn] *n* təntənəli şəkildə bəyan etmə / demə; təsdiq etmə, and içərək inandırma
**assiduity** [͵æsı'dju:ıtı] *n* cəhd, səy, çalışqanlıq, çalışma, cidd-cəhd
**assiduous** [ə'sıdjuəs] *adj* çalışqan, səyli, işə can yandıran; **to be ~ in *one's* work** işinə can yandırmaq, işində çalışqan/səyli olmaq
**assiduously** [ə'sıdjuəslı] *adv* çalışqanlıqla, səylə
**assiduousness** [ə'sıdjuəsnıs] *n* = **assiduity**
**assign** [ə'saın] *n hüq.* vərəsə; **heirs and ~s** varislər və vərəsələr
**assign** [ə'saın] *v* 1. təyin etmək *(müddət, vaxt)*; **to ~ a day for a meeting** görüş üçün gün təyin etmək; 2. müəyyənləşdirmək, müəyyən etmək *(sərhədi, hüdudu)*; 3. vəzifəyə təyin etmək; 4. pul buraxmaq/ayırmaq, pul təxsis etmək; 5. ayağına yazmaq, aid/istinad/izah etmək; *Jealousy was assigned as the motive for the crime Cinayətin səbəbi qısqanclıqla izah edildi*
**assignable** [ə'saınəbl] *adj* aid edilə bilən, istinad edilən, izah edilə bilən
**assignation** [͵æsıg'neıʃn] *n* 1. təyin etmə, təyin edilmə; təyinat; 2. ayırma, ayrılma; verilmə; 3. şərti görüş; aşiqlə məşuqun gizli görüşü; 4. kağız pul, əskinas
**assignment** [ə'saınmənt] *n* 1. təyin olunma, təyin edilmə; **~ to a position** vəzifəyə təyin olunma /edilmə; 2. ayırma, bölmə, bölünmə; **~ of lands** torpaq sahələrinin bölünməsi; 3. tapşırıq; ezamiyyət, ezam edilmə; 4. vəzifə, borc; *The policeman's assignment was to discover the murderer Polis nəfərinin vəzifəsi qatili tapmaq idi*
**assimilate** [ə'sımıleıt] *v* 1. həzm etmək; mənimsəmək; **to ~ food** qidanı həzm etmək; *We assimilate some kinds of food more easily than others Biz bəzi qidaları başqalarına/digərlərinə nisbətən daha asan həzm edirik;* **to ~ ideas** ideyanı mənimsəmək; *You have only remembered the facts well, not assimilated them Sən / Siz faktları ancaq yaxşı xatırlayırsan / xatırlayırsınız, onları mənimsəməmisən/mənimsəməmisiniz;* 2. assimilyasiya etmək; özünə oxşatmaq; *The USA has assimilated people from many European countries so that they are Americans ABŞ bir sıra Avropa ölkələri xalqlarını elə assimilyasiya etmişdir ki, onlar amerikalı olmuşlar;* **to ~ a breathed sound to a voiced sound** *fon.* kar səsi cingiltili səsə oxşatmaq; 3. assimilyasiya olunmaq, assimilyasiya edilmək, oxşadılmaq, bənzədilmək; həzm edilmək, mənimsənilmək
**assimilate to** [ə'sımıleıttə] *v* uyğunlaşdırmaq, oxşatmaq; *The laws of the defeated country were assimilated to those of the stronger country Məğlub olmuş ölkənin qanunları daha qüvvətli ölkənin qanunlarına uyğunlaşdırıldı*
**assimilation** [ə͵sımı'leıʃn] *n* 1. assimilyasiya; oxşatma, bənzətmə; **~ of sounds / languages** səslərin/dillərin assimilyasiyası; **progressive / regressive ~** *fon.* proqressiv *(irəli)*/reqressiv *(geri)* assimilyasiya; 2. *fiziol.* həzm etmə, assimilyasiya
**assimilationism** [ə͵sımı'leıʃnızm] *n* zorla assimilyasiya siyasəti
**assist** [ə'sıst] *v* 1. kömək /yardım etmək; **to ~ *smb.* with money** bir kəsə pulla kömək /yardım etmək; **to ~ *smb.* into the carriage** bir kəsə faytona minməyə kömək etmək; **to ~ a doctor in performing an operation** əməliyyat aparmaqda həkimə kömək etmək; *Can you assist me to lift the box? Qutunu qaldırmaqda mənə kömək edə bilərsənmi/bilərsinizmi? The father assisted his son with his mathematics Ata oğluna riyaziyyatdan kömək etdi;* 2. iştirak etmək; **to ~ in the work** işdə iştirak etmək; *She assisted at my wedding O mənim toyumda iştirak etdi; He assisted at the ceremony O, mərasimdə iştirak etdi*
**assistance** [ə'sıstəns] *n* kömək; **mutual ~** qarşılıqlı kömək/yardım; **technical ~** texniki kömək/yardım; **to render/to give/to lend ~** kömək/yardım göstərmək; *They came to my assistance Onlar mənim köməyimə gəldilər; He rendered me valuable assistance O mənə çox lazımlı kömək/köməklik göstərdi; May I / Can I be of any assistance? Mən sənə/sizə bir kömək edə / göstərə bilərəmmi?*
**assistant**[1] [ə'sıstənt] *n* 1. köməkçi, assistent *(professor və ya həkimin köməkçisi)*; 2. *hüq.* məhkəmənin köməkçisi
**assistant**[2] [ə'sıstənt] *adj* kömək edən, köməkçi; **Assistant Secretary of State** Dövlət katibinin



köməkçisi; **~ manager** müdir müavini, menecer köməkçisi; **an ~ cook** aşpaz köməkçisi
**assize** [ə'saız] *n* məhkəmədə işə baxma
**associate**[1] [ə'souʃıət] *n* 1. ortaq, şərik, yoldaş, kompanyon; kolleqa; 2. yoldaş, dost; 3. müttəfiq, silahdaş; 4. müxbir üzvü *(elmi cəmiyyətin)*; **~s of the Academy of Sciences** Elmlər Akademiyasının müxbir üzvü
**associate**[2] [ə'souʃıət] *adj* 1. birləşmiş, birləşdirilmiş, birgə; **~ societies** birləşmiş cəmiyyətlər; 2. köməkçi; **~ producer** rejissor köməkçisi; **~ editor** *amer.* redaktor köməkçisi
**associate**[3] [ə'souʃıeıt] *v* 1. birləşdirmək; bağlamaq; **to ~ one thing with another** bir şeyi digəri ilə bağlamaq/birləşdirmək; *We associate the name of Columbus with the discovery of America Biz Amerikanın kəşfini Kolumbun adı ilə bağlayırıq; If we can associate the 2 firms, we will be much stronger Əgər biz bu iki firmanı birləşdirə bilsək, daha qüvvətli olarıq;* 2. əlaqələndirmək; *I don't associate the 2 ideas Mən bu iki fikri əlaqələndirə bilmirəm; I associate politics with war Mən siyasəti müharibə ilə əlaqələndirirəm;* 3. birləşmək; **to ~ oneself** həmrəy/ həmfikir olmaq; *I associate myself with that opinion Mən də o fikrə qoşuluram;* 4. durub-oturmaq; tanışlıq etmək; ünsiyyət saxlamaq; **to ~ with men much older than oneself** özündən xeyli yaşlı adamlarla oturub-durmaq /ünsiyyət saxlamaq; *He associates with highly undesirable people O, son dərəcə arzuolunmaz adamlarla oturub-durur;* 5. birləşdirmək, qatmaq, tərkibinə daxil etmək; **gold ~d with copper** misle qatılmış qızıl
**association** [ə͵sousı'eıʃn] *n* 1. cəmiyyət, birlik, ittifaq; təşkilat, birləşmə; **International Phonetic Association** Beynəlxalq Fonetika Cəmiyyəti; *Let's form an association to help blind people Gəlin kor adamlara / korlara kömək etmək üçün bir cəmiyyət yaradaq;* 2. əlaqə; *My association with this firm did not last long Mənim bu firma ilə əlaqəm çox uzun çəkmədi;* 3. *psixol.* assosiasiya *(şüurda ayrı-ayrı təsəvvürlər arasındakı əlaqə)*; 4. ünsiyyət, yaxınlıq, dostluq; *I benefited much from my association with him Onunla dostluqdan mən çox mənfəət görmüşəm*
**assort** [ə'sɔ:t] *v* 1. növlərə ayırmaq, çeşidləmək; təsnif etmək; dərəcələrə ayırmaq; **to ~ goods** malları/ əmtəələri çeşidləmək /növlərə ayırmaq; 2. uyğun gəlmək/olmaq, həmahəng olmaq; *This doesn't assort with his earlier statement Bu onun əvvəl dediyinə uyğun gəlmir*
**assorted** [ə'sɔ:tıd] *adj* 1. çeşidlənmiş, seçilmiş; **~ goods** çeşidlənmiş/seçilmiş mal; 2. uyğun gələn, bir-birinə tay, tay gələn; *That husband and wife are a well-assorted pair O ər-arvad bir-birinə yaxşı taydır*
**assorting engine** [ə'sɔ:tıŋ'endʒın] *k.t.* çeşidləyici / çeşidləşdirici maşın
**assortment** [ə'sɔ:tmənt] *n* 1. sortlara ayırma/ayrılma, növlərə ayırma/ayrılma, çeşidlərə ayırma/ayrılma; 2. çeşid, assortiment; **rich ~ of goods** malların geniş çeşidi; *This tin contains an assortment of sweets Bu qutuda müxtəlif çeşidli konfet var;* 3. dəst, komplekt; **~ of tools** alətlərin dəsti / komplekti
**assuage** [ə'sweıdʒ] *v* 1. sakitləşdirmək *(ehtirası, qəzəbi və s.)*; 2. azaltmaq, yüngülləşdirmək *(ağrını, əziyyəti, arzunu və s.)*; 3. söndürmək, yatırmaq *(susuzluğu, aclığı)*; **to ~ *one's* thirst** susuzluğunu söndürmək/yatırmaq/kəsmək
**assuagement** [ə'sweıdʒmənt] *n* 1. sakitləşdirmə, rahatlandırma, təskin etmə; 2. ağrıkəsən dava-dərman
**assuasive** [ə'sweısıv] *adj* sakitləşdirən, sakitləşdirici; yumşaldan, yumşaldıcı; **~ voice** sakitləşdirici səs
**assume** [ə'sju:m] *v* 1. qəbul etmək; öz üzərinə götürmək; **to ~ a new name** yeni ad qəbul etmək; **to ~ responsibility** məsuliyyəti öz üzərinə götürmək; *I assume full responsibility Mən məsuliyyəti tam üzərimə götürürəm;* **to ~ the command** *hərb.* komandanlığı qəbul etmək; 2. görmək, götürmək; **to ~ measures** tədbir görmək, ölçü götürmək; 3. qəbul etmək, almaq; **to ~ the original form** ilkin formanı almaq; 4. mənimsəmək, yiyələnmək; qəsb etmək; *He assumed the reins of government O, hakimiyyəti mənimsədi/qəsb etdi;* 5. hiylə /riyakarlıq etmək; yalandan özünü ... göstərmək/... oxşatmaq, .../qoymaq/; göstərmək, yalandan göstərmək; **to ~ a look of innocence** özünü günahsız göstərmək; **to ~ airs** iddia/təşəxxüs satmaq, təkəbbürlənmək, lovğalanmaq, 6. özündən bədgüman olmaq; 7. güman /hesab/ehtimal/fərz etmək; *Let's assume that it is true ... Fərz edək ki, / Hesab edək ki, bu doğrudur...*
**assumed** [ə'sju:md] *adj* 1. yalançı, hiyləgər, uydurma, saxta; **~ ignorance** yalandan özünü bilməməzliyə qoyma; 2. uydurma, qondarma; **an ~ name** uydurma/qondarma ad, təxəllüs; 3. mənimsənilmiş, qəsb edilmiş; 4. təxmin /güman/ehtimal / fərz edilən
**assuming** [ə'sju:mıŋ] *adj* lovğa, təkəbbürlü, dikbaş, təşəxxüslü
**assumption** [ə'sʌmpʃn] *n* 1. öz üzərinə götürmə *(məsuliyyəti, vəzifəni və s.)*; **~ of risk** riski öz üzərinə götürmə; 2. mənimsəmə, qəsb etmə; **~ of power** hakimiyyəti mənimsəmə / qəsb etmə; 3. riyakarlıq, hiyləgərlik, yalançılıq; **~ of friendliness** yalançı mehribanlıq/səmimilik; 4. lovğalıq, təkəbbür, təşəxxüs, dikbaşlıq, saymazlıq; 5. güman, fərz, təxmin, ehtimal, təsəvvür
**assumptive** [ə'sʌmptıv] *adj* 1. təxmini, təqribi, ehtimal /güman edilə bilən; 2. özünə güvənən,

özünə qürrələnən; lovğa, saymaz, təkəbbürlü, dikbaş, iddialı, başqalarına xor baxan; **an ~ tone** lovğa/təkəbbürlü ton

**assurance** [ə'ʃuərəns] *n* 1. inandırma, inam, təminat, zaminlik, zəmanət; **~s of support** müdafiə etmək üçün zəmanət / zaminlik; **to give ~s** zəmanət / zaminlik vermək; *In spite of all his assurance, he did not come Təminat verməsinə baxmayaraq o gəlmədi;* 2. inam, əminlik, yəqinlik; **to speak with ~** inamla danışmaq; **to behave with ~** inamla davranmaq; 3. özünə inam, qətilik, mətanət, səbat; **to meet danger with ~** təhlükəni mətanətlə qarşılamaq; 4. özünə qürrələnmə, özünə güvənmə, özünə inanma; lovğalıq; həyasızlıq, abırsızlıq, sırtıqlıq; *Where did you pick up so much assurance? Bu qədər həyasızlıq səndə/ sizdə haradandır?* 5. sığorta; sığorta etmə/edilmə; **life ~** həyatını sığorta etmə

**assure** [ə'ʃuə<sup>r</sup>] *v* 1. inandırmaq, əmin etmək; **to ~ *smb.* of *smth.*** bir kəsi bir şey haqqında əmin etmək, bir kəsi bir şeyə inandırmaq; *He assures me of his innocence O məni inandırır ki, günahsızdır; He assures me that I am mistaken O məni inandırır ki, mən səhv edirəm;* **to ~ oneself of *smth.*** özünü bir şeyə inandırmaq; 2. zəmanət vermək, zaminlik vermək; **to ~ good work** yaxşı iş üçün zəmanət vermək; **to ~ comfort** rahatlıq / komfort üçün zəmanət vermək; 3. sakitləşdirmək, inam yaratmaq; *The news assured us Xəbər bizi sakitləşdirdi;* 4. sığortalamaq, sığorta etmək; **to ~ *one's* life** həyatını sığorta etdirmək

**assured** [ə'ʃuəd] *adj* 1. əmin, arxayın, xatircəm, inanmış, inamlı; **an ~ manner** inamlı davranış; 2. özünə qürrələnən/güvənən /inanan; həyasız, sırtıq, utanmaz; **~ ignorance** həyasız kobudluq / ədəbsizlik; 3. zəmanətli; zəmanət verilmiş; təminat verilmiş; **~ sale** zəmanətli satış; **~ income** təmin olunmuş / zəmanətli gəlir / qazanc; *There is an assured demand for such goods Belə mallara təminatlı tələb var;* 4. sığortalanmış, sığorta edilmiş; **~ life** sığorta edilmiş həyat

**assured** [ə'ʃuəd] *n* həyatı sığorta edilmiş / olunmuş şəxs; *On the death of the assured his family will receive a large sum Sığorta edilmiş /olunmuş şəxs öldükdə onun ailəsi böyük məbləğdə pul alacaq*

**assuredly** [ə'ʃuərıdlı] *adv* 1. inamlı, inamla, əminliklə; *He speaks very assuredly O çox inamla danışır;* 2. əlbəttə, şübhəsiz; *Assuredly, he will come tomorrow Əlbəttə, o sabah gələcək*

**assuredness** [ə'ʃuərıdnıs] *n* 1. yəqinlik, əminlik, xatircəmlik; özünə inam/əminlik; qətiyyət, qətilik; **to encounter with ~ any opposition** hər cür maneəni qətiyyətlə qarşılamaq; 2. özünə qürrələnmə/ güvənmə/inanma; cəsarət, cürət; həyasızlıq, sırtıqlıq, abırsızlıq

**aster** ['æstə<sup>r</sup>] *n bot.* astra *(bağ çiçəyi)*

**asterisk**[1] ['æstərısk] *n* ulduz, ulduzcuq *(ulduzşəkilli mətbəə nişanı)*

**asterisk**[2] ['æstərısk] *v* ulduz işarəsi ilə qeyd etmək

**asteroid**[1] ['æstərɔıd] *n* 1. *astr.* asteroid, kiçik planet; 2. *zool.* dəniz ulduzu

**asteroid**[2] ['æstərɔıd] *adj* ulduzaoxşar, ulduzşəkilli

**asthenia** [æs'θi:njə] *n tib.* asteniya, zəiflik, gücsüzlük

**asthenic** [æs'θenık] *adj tib.* astenik, zəif, gücsüz, arıq

**asthenical** [æs'θenıkəl] *adj* = **asthenic**

**asthma** ['æsmə] *n tib.* astma, təngnəfəslik

**asthmatic**[1] [æs'mætık] *n* astmatik, astma xəstəliyinə tutulmuş adam

**asthmatic**[2] [æs'mætık]*adj* 1. astmadan əziyyət çəkən; 2. astma əleyhinə *(dərman haq)*

**asthmatical** [æs'mætıkəl] *adj* = **asthmatic**[2]

**astigmatic** [ˌæstıg'mætık] *adj tib.* astiqmatik

**astigmatism** [æs'tıgmətızm] *n tib.* astiqmatizm *(nöqsanlı optik şüşələrdə və ya göz təbəqələrində şüaların müxtəlif dərəcədə sınması nəticəsində cismin aydın görünməməsi)*

**astir** [ə'stə:<sup>r</sup>] *adj* 1. hərəkətdə olan; 2. ayaq üstə, yataqdan qalxmış; *You're astir early this morning Sən / Siz bu səhər yataqdan erkən durmusan/durmusunuz;* 3. həyəcanlı, əsəbi, təlatümlü; *Everybody was astir with the news Xəbərdən hamı həyəcanlandı*

**astonish** [əs'tɔnıʃ] *v* təəccübləndirmək, heyrətləndirmək; heyrətə salmaq; *The news astonished everybody Xəbər hamını təəccübləndirdi / heyrətləndirdi;* **to be ~ed at *smth.*** bir şeyə təəccüblənmək / heyrətlənmək

**astonishing** [əs'tɔnıʃıŋ] *adj* təəccübləndirici, təəccüblü, qəribə; heyrətləndirici, son dərəcə gözəl; qeyri-adi; **age of ~ events** qeyri-adi / təəccüblü /qəribə hadisələr əsri; **man of ~ memory** heyrətləndirici / qeyri-adi yaddaşı olan adam

**astonishment** [əs'tɔnıʃmənt] *n* təəccüb, heyrət; *To my astonishment he was there before us Məni təəccübləndirən o idi ki, o bizdən qabaq orada idi; She stared in astonishment at me O, heyrət içində mənə baxdı*

**astound** [əs'taund] *v* heyrətləndirmək, heyrətə salmaq, heyran etmək, mat qoymaq; **to ~ the world with great events** dünyanı böyük hadisələrlə heyrətə salmaq / heyrətləndirmək/mat qoymaq / heyran etmək; *She was astounded when she heard she had won O qalib gəldiyini eşitdikdə heyrətləndi / mat qaldı*

**astounding** [əs'taundıŋ] *adj* heyranedici, valehedici, son dərəcə gözəl; **~ memory** heyranedici / valehedici yaddaş

**astrakhan** [ˌæstrə'kæn] *n* qaragül, qaragül dərisi, buxara dərisi *(qıvrım yunlu quzu dərisi)*; **~ coat** qaragül dərisindən tikilmiş palto



**astral** ['æstrəl] *adj* ulduzlu, ulduzlara aid olan

**astray** [ə'streı] *adv:* **to go/ to run ~** azmaq, yolunu çaşmaq, yolundan çıxmaq; **to lead ~** yolundan çıxarmaq, azdırmaq, çaşdırmaq; *We missed the track and went astray Biz cığırı itirdik və azdıq; I have gone astray somewhere in my calculations Mən kalkulyasiyamda haradasa çaşmışam*

**astride** [ə'straıd] *adv* 1. atla, atlı; **to ride ~** at minmək, atla getmək, at sürmək; 2. ayağını aralı qoyaraq; ayaqlarını sallayaraq; **to stand ~** ayaqlarını aralı qoyaraq dayanmaq; *He sat astride on the chair O, ayaqlarını sallayaraq stulda oturdu*

**astringency** [əs'trındʒənsı] *n* 1. büzücü / büzüşdürücü xassə; **the ~ of tea** çayın büzücü / büzüşdürücü xassəsi; 2. sərtlik, kəskinlik, ciddilik, ciddiyyət

**astringent**[1] [əs'trındʒənt] *n* büzüşdürücü / büzücü maddə

**astringent**[2] [əs'trındʒənt] *adj* 1. büzüşdürücü, büzücü; qankəsici; **~ substances/medicines** büzüşdürücü maddələr/dərmanlar; 2. kəskin, sərt, ciddi; **~ remarks** ciddi / kəskin iradlar

**astringently** [əs'trındʒəntlı] *adv* ciddi, ciddiliklə; sərt, kəskin, şiddətlə

**astro-** ['æstrou] *mürəkkəb terminlərin komponenti; Azərbaycan türkcəsində* **astro-** *komponentinə uyğun gəlir və sözün ulduzlara aid olduğunu göstərir:* **astro**logy astrologiya *(ulduzlar haqqında sxolastik elm)*, **astro**physics *(göy cisimlərinin tərkib və quruluşundan, fiziki və kimyəvi xassələrindən bəhs edən elm)*

**astrodome** ['æstroudoum] *n* astroqübbə *(astronomik müşahidələr aparmaq üçün qüllə)*

**astrogation** [ˌæstrə'geıʃn] *n* astronaviqasiya *(ulduzlara görə dənizdə gəminin və göydə təyyarənin vəziyyətini təyin etmə elmi)*

**astrolabe** ['æstrouleıb] *n astr.* astrolyabiya, üstürlab *(qədimdə ulduzların məsafəsini öyrənmək üçün alət)*

**astrologer** [ə'strɔlədʒə<sup>r</sup>] *n arx.* münəccim, rəmmal

**astrology** [ə'strɔlədʒı] *n* astrologiya, nücum elmi, münəccimlik *(qədim zamanlarda ulduzlar haqqında sxolastik elm, həmçinin ulduzların vəziyyətinə görə fal açma)*

**astrological** [ə'strɔlədʒıkəl] *adj* astroloji, astrologiyadan bəhs edən

**astronaut** ['æstrənɔ:t] *n* astronavt

**astronautics** [ˌæstrə'nɔ:tıks] *n* astronavtika *(kosmik nəqliyyat vasitələri və onları idarə etmə haqqında elm)*

**astronomer** [ə'strɔnəmə<sup>r</sup>] *n* astronom *(ulduzları elmi baxımdan öyrənən şəxs)*

**astronomic** [ˌæstrə'nɔmık] *adj* = **astronomical**

**astronomical** [ˌæstrə'nɔmıkəl] *adj* 1. astronomik; **~ year** astronomik il; **~ unit** astronomik vahid; 2. ağlasığmayan, çox böyük *(məbləğ haq.)*; **~ sums of money** astronomik məbləğdə pul; **an ~ salary** astronomik maaş / əmək haqqı / donluq

**astronomically** [ˌæstrə'nɔmıkəlı] *adv* astronomik baxımdan, astronomik tərzdə

**astronomy** [ə'strɔnəmı] *adj* astronomiya *(göy cisimləri haqqında elm)*; **physical ~** fiziki astronomiya

**astrophysical** [ˌæstrə'fızıkəl] *adj* astrofiziki

**astrophysics** [ˌæstrou'fızıks] *n* astrofizika *(göy cisimlərinin tərkib və quruluşundan, fiziki və kimyəvi xassələrindən bəhs edən elm)*

**astrophysicist** [ˌæstrə'fızısıst] *n* astrofizik *(astrofizika elmi ilə məşğul olan adam)*

**astute** [ə'stju:t] *adj* 1. bic, hiyləgər, kələkbaz, fəndgir; məkrli, xain; 2. ağıllı, fərasətli, gözüaçıq; **to make an ~ move** ağıllı addım atmaq

**astutely** [əs'tju:tlı] *adv* 1. hiyləgərcəsinə, kələkbazlıqla, fəndgirliklə; 2. ağılla, fərasətlə, gözüaçıqlıqla

**astuteness** [ə'stju:tnıs] *n* 1. hiyləgərlik, biclik, hiylə, fənd; fəhm; 2. fərasət, bəsirət, ağıllılıq, fərasətlilik, gözüaçıqlıq

**asunder** [ə'sʌndə<sup>r</sup>] *adv* pərən-pərən, ayrı-ayrı, bir-birindən aralı / ayrı, ayrıca, tək; **to drive ~** pərən-pərən salmaq; bir-birindən ayrı salmaq; **to rush ~** pərən-pərən düşmək, ayrı-ayrı tərəflərə qaçmaq; *The war forced the parents and children asunder Müharibə valideynləri və uşaqları pərən-pərən saldı;* 2. bir-birindən uzaq /aralı; *The two houses lay asunder Bu iki ev bir-birindən aralı yerləşir;* 3. yarı, parça-parça, qırıq-qırıq; **to break/to cut ~** parça-parça qırmaq/kəsmək; *The boat was torn asunder by the storm Tufan qayığı parça-parça etdi*

**asylum** [ə'saıləm] *n* 1. sığınacaq, daldalanacaq yer; yetimxana; qocalar evi; **an orphan ~** yetimxana; **an ~ for the poor** kasıblar üçün qocalar evi; 2. sığınacaq; **a political ~** siyasi sığınacaq; **to grant political ~** siyasi sığınacaq vermək; 3. psixiatriya müalicəxanası, psixi xəstələr üçün xəstəxana, dəlixana

**asymmetric** [ˌæsı'metrık] *adj* asimetrik, simmetriyasız, uyğunsuz

**asymmetrical** [ˌæsı'metrıkəl] *adj* = **asymmetric**

**asymmetrically** [ˌæsı'metrıkəlı] *adv* asimmetrik olaraq

**asymmetry** [æ'sımıtrı] *n* asimmetriya, simmetriyasızlıq, uyğunsuzluq

**asyndetic** [ˌæsın'detık] *adj* asindetik, bağlayıcısız

**asyndeton** [æ'sındıtən] *n* şəkilçisizlik

**asyntactic** [ˌæsın'tæktık] *adj* asintaktik, sintaktik qanunlara uyğun olmayan

**at** *(tam forma:* [æt], *qısa forma:* [ət]) *prep* 1. *Məkan mənası bildirərkən aşağıdakı hallarda işlənir: 1) əşya və ya şəxsin bir şeyin yaxınlığında olduğunu göstərir:* yanında, yaxınlığında; ~

**the door/the window/the sea** qapının / pəncərənin/ dənizin yanında / yaxınlığında; *The teacher was standing at the door/window Müəllim qapının/pəncərənin yanında dayanmışdı; My uncle lives at the sea Dayım dənizin yaxınlığında yaşayır; 2) Bir şey və ya əşyanın müəyyən bir məkanda olduğunu göstərir;* -da, -də; ~ **the tram stop** tramvay dayanacağında; **the bus stop** avtobus dayanacağında; ~ **the foot of the mountain** dağın ətəyində; ~ **the station** vağzalda; *I met him at the station Mən onu vağzalda qarşıladım;* ~ **London airport** London hava limanında; *Our plane stopped at London (airport) on its way to New York Bizim təyyarəmiz Nyu Yorka uçarkən Londonda dayandı;* ~ **my aunt's** xalamgildə; *I saw her first at my aunt's Mən ilk dəfə onu xalamgildə gördüm;* ~ **a factory** fabrikdə; *My uncle works at a factory Mənim dayım fabrikdə işləyir; 3) Müəyyən bir məkana çatmağı göstərir:* -a, -ə; **to arrive** ~ **the station** vağzala çatmaq; *The train arrived at the station in time Qatar vağzala vaxtında çatdı; I was surprised at his words Mən onun sözlərinə təəccüb etdim/qaldım;* 2. *Zaman bildirərkən aşağıdakı mənaları ifadə edir:* 1) *Zaman göstərir:* -da, -də; ~ **two o'clock** saat ikidə; *The children returned at two o'clock Uşaqlar saat ikidə qayıtdılar;* ~ **an appointed date** müəyyən edilmiş tarixdə; ~ **the time** həmin vaxtda; ~ **the beginning of this century** bu əsrin başlanğıcında; 2) *Yaş göstərir:* -da, -də; ~ **an early age** erkən yaşda; *He lost his father at an early age O, atasını erkən yaşında itirdi;* ~ **the age of 60**/~ **60 years of age** 60 yaşında; 3) *Bəzi hallarda Azərbaycan türkcəsinə tərcümə edilmir;* ~ **noon** günorta, ~ **night** gecə; ~ **midnight** gecəyarı; *He turned home at noon / at night /at midnight O, evə günorta / gecə / gecəyarı qayıtdı;* 3. *Fəaliyyət və ya proses bildirir;* -da, -də; ~ **school** məktəbdə; ~ **court** məhkəmədə, ~ **factory** fabrikdə; ~ **the wheel** sükan arxasında; ~ **the piano** piano arxasında; ~ **table** stol arxasında, yemək zamanı; ~ **the concert** konsertdə; ~ **the theatre** teatrda; ~ **the meeting** iclasda; ~ **the lesson** dərsdə; 4. *Vəziyyət bildirir:* vaxtı, zamanı; ~ **rest** istirahət zamanı/vaxtı; ~ **peace** sülh zamanı/vaxtı; ~ **war** müharibə vaxtı/zamanı; ~ **work** iş vaxtı / zamanı; 5. *Hərəkətin istiqamətini bildirir:* -a, -ə; **to look** ~ ***smb./smth.*** bir kəsə / bir şeyə baxmaq; **to throw** ***smth.*** ~ ***smb.*** bir kəsə bir şey atmaq; **to laugh** ~ ***smb.*** bir kəsə gülmək; 6. *Hərəkətin tərzini bildirir:* 1) -da, -də; ~ **a flash** bir anda; ~ **one blow** bir zərbədə; 2) ilə, -la, -lə; ~ **intervals** fasilələrlə, ara-sıra; ~ ***smb.'s*** **request** bir kəsin xahişi ilə; 7. *Sifətin üstünlük dərəcə forması ilə işlədilir:* ~ **best** ən yaxşı halda; ~ **worst** ən pis halda; 8. *ölçü, miqdar, qiymət bildirən sözlərlə işlədilir:* ~ **2 shillings** 2 şillinqə; ~ **a speed of 25 km** 25 km sürətlə; 9. *Məsafə bildirir:* ~ **a distance** uzaqda; **to keep** ***smb.*** ~ **arm's length** bir kəsi böyük məsafədə saxlamaq, bir kəsi yaxına buraxmamaq; **10.** üzərində, ilə; **to work** ~ ***smth.*** 1) bir şey üzərində işləmək; **to work** ~ **physics** fizika ilə məşğul olmaq; *He is working at physics O, fizika ilə məşğuldur / məşğul olur;* **11.** *Aşağıdakı birləşmələrdə işlədilir:* **good** ~ **languages** dil öyrənməkdə qabiliyyəti olma; **good** ~ **mathematics** riyaziyyata qabiliyyəti olma; ~ **first** əvvəlcə, öncə; ~ **length** 1) nəhayət, axırda, nəticədə; 2) müfəssəl *(surətdə)*, təfsilatı ilə, təfərrüatı ilə, ətraflı; ~ **once** 1) dərhal, əlüstü, o saat; eyni vaxtda, eyni zamanda, bir vaxtda; 2) birdən, birdən-birə, qəfildən, qəflətən; *At ease! hərb. Azad! At attention! hərb. Fərağat!;* **to arrive** ~ **a conclusion / a decision** bir nəticəyə / qərara gəlmək; ~ **all** qətiyyən, əsla; *He doesn't smoke at all O, qətiyyən/əsla papiros çəkmir; Not at all Qətiyyən yox; Eybi yoxdur; - "I am sorry to trouble you" - "Not at all" - " Bağışlayın, sizə əziyyət verirəm" - "Qətiyyən yox / Eybi yoxdur"*

**atavism** [ˈætəvɪzəm] *n* atavizm *(nəsildə qədim babalara məxsus əlamətlərin görünməsi)*

**atavistic** [ˌætəˈvɪstɪk] *adj* atavistik

**ate** [et, eɪt] **to eat** *felinin pt forması*

**-ate** [-eɪt, ət] *suff I Cəmlik bildirən isimlər düzəltmək üçün işlədilir:* magistr**ate** hakimlər; elector**ate** seçicilər; 2. *Bəzi kimyəvi birləşmələrin adını bildirən isimlər düzəltmək üçün işlədilir:* nitr**ate** nitrat turşusu, *(nitrat turşusunun duzu)*; sulph**ate** sulfat, *(sulfat turşusunun duzu)*

**-ate** [-eɪt, ət] *suff II sifət düzəldən şəkilçi:* desper**ate** ümidsiz, çarəsiz; temper**ate** mötədil, mülayim *və s.*

**-ate** [-eɪt] *suff III fel düzəldən şəkilçi:* to formul**ate** qısaca və dürüst ifadə etmək; to activ**ate** aktivləşdirmək; to separ**ate** ayırmaq *və s.*

**atelier** [ˈætəlɪeɪ] *n* atelye *(iş otağı, emalatxana)*

**athanasy** [əˈθænəsɪ] *n* əbədilik, ölməzlik

**atheism** [ˈeɪθɪɪzm] *n* ateizm, allahsızlıq

**atheist** [ˈeɪθɪɪst] *n* ateist, allahsız

**atheistic** [ˌeɪθɪˈɪstɪk] *adj* ateist

**atheistical** [ˌeɪθɪˈɪstɪkəl] *adj* = **atheistic**

**atheistically** [ˌeɪθɪˈɪstɪkəlɪ] *adv* ateistcəsinə, allahsızcasına, ateist kimi

**athlete** [ˈæθliːt] *n* 1. idmançı; yüngül atlet; 2. atlet, pəhləvan; 3. yüngül atletika yarışının iştirakçısı *(qədim Yunanıstanda)*

**athletic** [æθˈletɪk] *adj* 1. idman, sport; ~ **ground** idman/sport meydanı; 2. atletik, güclü, qüvvətli; pəhləvan, sağlam, sağlam bədənli; ~ **build** pəhləvan bədənli/ cüssəli

**athletics** [æθˈletɪks] *n* atletika; idmanla / sportla məşğul olma; **track-and-field** ~ yüngül atletika; **to engage in** ~ yüngül atletika ilə məşğul olmaq; **to compete in** ~ yüngül atletika yarışlarında iştirak etmək



**athwart** [əˈθwɔːt] *prep* 1. eninə, köndələn; çəpinə, çəpəki; *The ship sailed athwart our path Gəmi bizim yolumuza köndələn üzürdü;* 2. əleyhinə, əksinə; ~ **his plan** onun planının əleyhinə/əksinə; ~ **the wishes of his friends** dostlarının arzusunun/istəyinin ziddinə/əleyhinə/əksinə

**-atic** [-ætɪk] *suff Bir sıra sifətlərin düzəldilməsində iştirak edir:* aqu**atic** sulu; err**atic** dəyişkən; lymph**atic** limfatik; əzgin, süst

**-ation** [-eɪʃən] *suff isim düzəldən şəkilçi: 1) Hərəkət və ya proses ifadə edən isimlər düzəldir:* alter**ation** dəyişdirmə; organiz**ation** təşkil etmə; 2) *Vəziyyət və ya keyfiyyət bildirən isimlər düzəldir:* occup**ation** məşğulluq; starv**ation** aclıq çəkmə, aclıq; 3) *konkret hərəkətin nəticəsini və ya əşyanın özünü bildirən isimlər düzəldir:* combin**ation** kombinasiya, quraşdırma

**-ative** [ətɪv, -eɪtɪv] *suff Əsasən -ate suffiksli fellərdən düzəldilən nisbi sifətlərdə təsadüf edilir:* demonstr**ative** əyani, sübutlu, əsaslı; contempl**ative** seyrçi, fəaliyyətsiz

**a-tiptoe** [əˈtɪptou] *adv* ayaq barmaqlarının ucunda

**Atlantic** [ətˈlæntɪk] *adj* 1. atlantik; ~ **islands** Atlantik okeanının adaları; 2. uzaq; ~ **regions** uzaq rayonlar

**at large** [ətˈlaːdʒ] 1. azad, azadlıqda; genişlikdə; **to set** ~ azad etmək, azadlığa buraxmaq; *She will soon be at large O tezliklə azad olacaq;* 2. geniş, əsaslı, ətraflı, hərtərəfli; **to talk/to write** ~ ətraflı danışmaq / yazmaq; **to go into the question** ~ məsələni geniş / ətraflı / hərtərəfli aydınlaşdırmaq / izah etmək; 3. bütün, geniş, hamısı, tam; **country** ~ bütün ölkə; **people** ~ bütün insanlar; **public** ~ geniş kütlə; **the Mammadov family** ~ bütün Məmmədovlar ailəsi, Məmmədovlar ailəsinin hamısı; **ambassador** ~ geniş səlahiyyətli / səlahiyyəti olan səfir; 4. müəyyən işi olmayan, boş; *Are you at large or have you another occupation? Sən / Siz boşsan/boşsunuz yaxud başqa bir məşğuliyyətin / məşğuliyyətiniz var?*

**atlas** [ˈætləs] *n* I atlas *(tarix, coğrafiya xəritələri məcmuəsi)*

**atlas** [ˈætləs] *n* II atlaz *(ipək parça növü)*

**atmosphere** [ˈætməsfɪəʳ] *n* 1. atmosfer *(yeri bürüyən hava təbəqəsi)*; 2. hava *(otaq, şəhər və s. haq)*; **a smoky** ~ tüstülü hava; 3. vəziyyət, mühit, şərait; **friendly** ~ dostluq mühiti / şəraiti; **tense** ~ gərgin mühit / şərait; 4. *fiz.* atmosfer *(təzyiq vahidi)*

**atmospheric** [ˌætməsˈferɪk] *adj* 1. atmosfer; ~ **condensation** atmosfer çöküntüləri; ~ **pressure** atmosfer təzyiqi; 2. ecazkar / qəribə və s. hiss doğuran; *That music is very atmospheric Bu musiqi adamda ecazkar hisslər doğurur*

**atmospherical** [ˌætməsˈferɪkəl] *adj* = **atmospheric**

**atmospherics** [ˌætməsˈferɪks] *n pl.* atmosfer maneələri *(radio verilişlərini qatmaq üçün atmosferdə törədilən küy)*

**atom**[1] [ˈætəm] *n* 1. atom *(kimyəvi elementlərin kiçik hissəciyi)*; **tagged** ~ nişanlı atom; 2. zərrə; damla; *There's not an atom of truth in that statement Bu məlumatda/bəyanatda/fikirdə zərrə qədər həqiqət yoxdur; There was not an atom of water Bir damla su yox idi*

**atom**[2] [ˈætəm] *adj* atom; ~ **bomb** atom bombası; ~ **test** atom bombasının sınağı; ~ **smashing** *fiz.* atom nüvəsinin parçalanması

**atomaniac** [ˌætəˈmeɪnɪæk] *n* atom müharibəsini təbliğ edən

**atom-bomb** [ˈætəmbɔm] *v* atom bombası atmaq

**atomic** [əˈtɔmɪk] *adj* atom; ~ **energy** atom enerjisi; ~ **nucleus** atom nüvəsi; ~ **structure** atomun quruluşu; ~ **weight** atom çəkisi; ~ **heat** atom istilik tutumu; ~ **pile** atom reaktoru /qazanı; ~ **waste** radioaktiv tullantı; ~ **weapon** atom silahı; ~ **bomb** atom bombası; **an** ~ **ship** atom gəmisi; ~ **scientists** atomla məşğul olan alimlər;

◊ **Atomic age** atom əsri; ~ **diplomacy** atom diplomatiyası

**atomist** [ˈætəmɪst] *n* atom mütəxəssisi; atomizm nəzəriyyəsinin tərəfdarı *(fəlsəfədə)*

**atomization, -isation** [ˌætəmaɪˈzeɪʃn] *n* mayeni çiləmə/ tozlama; xırdalama *(bərk maddə haq.)*

**atomize, -ise** [ˈætəmaɪz] *v* xırdalamaq; tozlamaq, çiləmək

**atomizer, iser** [ˈætəmaɪzəʳ] *n* 1. püskürdücü *(cihaz)*, pulverizator *(mayeni toz halında fısqırtmaq üçün cihaz)*; 2. *tex.* forsunka *(buxar qazanlarının odluğuna, mühərriklərin silindrinə və s.-yə maye və ya toz halında yanacaq vermək üçün cihaz)*, maye püskürdən *(cihaz)*; 3. bərk maddələri narın döyən / parçalayan qurğu

**atom-monger** [ˈætəmˌmʌŋgəʳ] *n d.d.* atom müharibəsini qızışdıran

**atomism** [ˈætəmɪzm] *n* atomizm, atomistika *(bütün materiyanın atomlardan ibarət olduğunu iddia edən materialist nəzəriyyə)*

**atom-smasher** [ˈætəmˌsmæʃəʳ] *n fiz.* nüvə hissəciklərinin sürətləndiricisi

**atonal** [eɪˈtounəl] *adj mus.* tonsuz, tonu olmayan, heç bir mümkün tona əsaslanmayan

**atonality** [ˌeɪtouˈnælɪtɪ] *n mus.* tonsuzluq, tona əsaslanmama, mümkün tonların heç birinə uyğun olmama

**atone** [əˈtoun] *v* 1. yumaq, təmizləmək *(günahını)*; **to** ~ **sin** günahını yumaq / təmizləmək; 2. **(for)** əvəzini vermək, yerini doldurmaq, ödəmək, əvəzini çıxmaq; *He atoned for his crimes O öz cinayətlərinin əvəzini verdi; He tried to atone for his rudeness by sending the girl flowers Qıza gül göndərməklə o, kobudluğunun əvəzini çıxmağa çalışdı*

**atonement** [əˈtounmənt] *n* 1. kompensasiya,

əvəz, bağışlanma, günahını təmizləmə; **2.** kompensasiya, əvəzini vermə, yerini doldurma, ödəmə; əvəz; **to make / to offer ~ (for)** kompensasiya/əvəz təklif etmək

**atonic** [æ'tɔnık] *adj* **1.** *fon.* vurğusuz; ~ **syllable** vurğusuz heca; **2.** səssiz, kar; **3.** *tib.* ölgün, zəif, süst, ölüvay

**atony** ['ætənı] *n tib.* atoniya *(tonusun itməsi)* süstlük, cansızlıq, ölüvaylıq, zəiflik

**atop**[1] [ə'tɔp] *adv* **1.** üstündə, üstdə; **a glass of beer with white foam** ~ üstündə ağ köpük olan bir stəkan pivə; **2.**: ~ **of** təpəsində, başında; ~ **of the cliff** sıldırım qayanın təpəsində / başında

**atop**[2] [ə'tɔp] *prep arx.* yuxarıda, üstdə; üstündə; üzərində; ~ **the waves** dalğaların üstündə

**atrocious** [ə'trouʃəs] *adj* **1.** amansız, rəhmsiz, zalım, qəddar, dəhşətli, müdhiş; ~ **crime** dəhşətli /müdhiş cinayət; ~ **deed** dəhşətli hərəkət/ əməl; **2.** iyrənc, çox pis, murdar; ~ **weather** iyrənc/murdar hava; ~ **handwriting** çox pis xətt; **an ~ meal** iyrənc/çox pis yemək

**atrociously** [ə'trouʃəslı] *adv* çox pis, qəddarcasına; *The soldiers tread atrociously with prisoners Əsgərlər əsirlərlə qəddarcasına davranırlar;* ~ **bad dinner** iyrənc/çox pis nahar; ~ **bad manners** iyrənc/çox pis xasiyyət

**atrocity** [ə'trɔsıtı] *n* **1.** rəhmsizlik, amansızlıq, qəddarlıq, zalımlıq; **atrocities of war** müharibənin dəhşətləri; **to commit** ~ cinayət etmək; *Shooting prisoners of war is an atrocity Hərbi əsirləri güllələmək qəddarlıqdır;* **2.** *d.d.* kobud səhv; **atrocities in spelling** orfoqrafiyada kobud səhvlər; **3.** iyrənclik, mənfurluq; *That picture is an atrocity O şəkil çox iyrəncdir*

**atrophic** [æ'trɔfık] *adj* arıqlamış; üzgün, üzülmüş, gücdən düşmüş

**atrophied** ['ætrəfıd] *adj* **1.** ölgünləşmiş, fəaliyyətdən qalmış, həyat qabiliyyətini itirmiş; ~ **muscles** ölgünləşmiş / fəaliyyətdən qalmış əzələlər; **2.** əldən/haldan / gücdən /tabdan /taqətdən düşmüş, üzülmüş, üzgün, tabsız

**atrophy**[1] ['ætrəfı] *n tib.* **1.** atrofiya, həyat fəaliyyətini itirmə; arıqlıq, zəiflik, sısqalıq; **2.** *biol.* inkişafdan qalma, inkişafın dayanması; **3.** kütləşmə, kütləşdirmə, kütləşdirilmə *(hisslər haq)*; itirmə *(əlaməti)*, itki; ~ **of conscience** vicdanın kütləşməsi

**atrophy**[2] ['ætrəfı] *v* **1.** ölgünləşmək, həyat qabiliyyətini itirmək; *The disease atrophied his legs Xəstəlik onun qıçlarını ölgünləşdirdi; His legs quickly atrophied Onun qıçları tezliklə həyat fəaliyyətini itirdi;* **2.** çox yormaq, taqətdən /əldən salmaq, üzmək; **3.** zəifləmək, taqətdən salınmaq, zəifləmək, əldən düşmək, üzülmək

**attach** [ə'tætʃ] *v* **1.** birləşdirmək, bənd etmək, bərkitmək, qoşmaq; bağlamaq; yapışdırmaq; **to ~ a label to a parcel** bağlamanın üstünə etiket bağlamaq/ yapışdırmaq; **to ~ a stamp** marka yapışdırmaq; **to ~ a seal to a document** sənədə möhür vurmaq; *I attached a wire to the radio Mən radioya məftil bağladım;* **2.** əlavə etmək, qoşmaq; **to ~ documents to a letter** məktuba sənədlər qoşmaq / əlavə etmək; **3.** göndərilmək; *He was attached to a regiment O, alaya göndərildi;* **to ~ oneself** qoşulmaq, daxil olmaq; *He attached himself to the society O, təşkilata daxil oldu;* **4.** bağlanmaq; *He is deeply attached to the girl O, qıza çox bağlanıb;* **5.** *hüq.* qüvvəyə minmək; *The insurance attaches from the moment the goods leave the warehouse Mal anbardan çıxarılan andan sığorta qüvvəyə minir;* **6.** *hüq.* həbs etmək, dustaq etmək, tutmaq; başını bağlamaq *(əmlakın)*

**attaché** [ə'tæʃeı] *n fr.* attaşe *(müəyyən sahədə ixtisası olan səfarətxana işçisi)*; **military** ~ hərbi attaşe

**attaché case** [ə'tæʃıkeıs] *n* **1.** papka, qovluq; **2.** dəridən hazırlanmış yastı əl çamadanı, diplomat *(sənəd, kağız üçün)*

**attached** [ə'tætʃt] *adj* **1.** bərkidilmiş; əlavə edilmiş; **copies ~ to the document** sənədə əlavə edilmiş nüsxələr; **2.** sadiq, sədaqətli, bağlanmış; ~ **to *one's* friends** öz dostlarına sadiq / sədaqətli; *The brothers were deeply attached Qardaşlar bir-birinə çox sadiq idilər / bağlı idilər;* **3.** *hüq.* həbs edilmiş, dustaq edilmiş; siyahıya alınmış *(əmlak haq.)*

**attachedly** [ə'tætʃıdlı] *adv* sədaqətlə, məhəbbətlə; **yours ~** sizə sədaqətlə *(məktubun sonunda yazılır)*

**attachment** [ə'tætʃmənt] *n* **1.** birləşdirmə, birləşdirilmə; qoşma, qoşulma; yapışdırma, yapışdırılma; **2.** bağlılıq, məhəbbət, sədaqət, vəfa; ~ **to a friend** dosta məhəbbət/sədaqət/vəfa; **3.** qüvvəyə minmə; ~ **of insurance** sığortanın qüvvəyə minməsi; **4.** *hüq.* başını bağlama *(mal, mülk haq)*; bir şəxsin həbs edilməsi və ya əmlakın başının bağlanması haqqında əmr; **5.** *tex.* qurğu, alət, cihaz, mexanizm

**attack**[1] [ə'tæk] *n* **1.** hücum, həmlə, basqın; **sudden/surprised** ~ qəfil hücum / həmlə / basqın; **armed** ~ silahlı hücum / basqın; **to make an** ~ hücum etmək, hücuma keçmək; **to open an** ~ hücuma / həmləyə başlamaq; **to carry/to deliver an** ~ zərbə endirmək, hücuma keçmək; **to return to the** ~ yenidən /təkrarən hücuma keçmək; **to repel/to repulse an** ~ hücumu/həmləni dəf etmək; **2.** hücum, məzəmmət; düşməncəsinə tənqid; ~ **against the policy of government** dövlətin siyasətinə qarşı hücum; **3.** *tib.* tutma; **heart** ~ ürək tutması

**attack**[2] [ə'tæk] *adj* hücum; ~ **plane** *av.* hücumçu *(alçaqdan uçaraq yerdəki hədəflərə hücum edən təyyarə)*; ~ **aviation** hücum təyyarələri; ~ **position** *hərb.* hücum üçün başlanğıc mövqe; ~ **order** *hərb.* hücuma keçmək üçün əmr



**attack**[3] [ə'tæk] *v* **1.** hücum etmək; həmlə etmək; **to ~ a town** şəhərə hücum etmək; **to ~ an enemy** düşmənə hücum etmək; *The enemy attacked us at night Düşmən bizə gecə hücum etdi;* **2.** tənqid etmək, tənqidlə hücum etmək; **to ~ *smb.'s* conduct** bir kəsin hərəkətlərini/davranışını tənqid etmək; *His proposals were attacked in the newspapers Onun təklifləri qəzetlərdə tənqid edildi;* **3.** işi görməyə ciddiyyətlə başlamaq, işə ciddi başlamaq; **to ~ a problem** problemi həll etməyə ciddi girişmək; **4.** üstünə düşmək, hücum çəkmək; **to ~ the food** yeməyin üstünə düşmək, yeməyə hücum çəkmək; *He attacked the food as if he had not eaten for a week O, yeməyin üstünə elə düşdü ki, elə bil bir həftə heç nə yeməmişdi;* **5.** ziyan vurmaq, korlamaq; *The disease attacked his bones Xəstəlik onun sümüklərini korladı;* **6.** xarab etmək, dağıtmaq, pis etmək; *The damp is attacking the wall Nəm divarı korlayır/dağıdır;* **7.** məhv etmək, ziyan vurmaq; *Crops were attacked by locusts Çəyirtkələr taxılı məhv etdi;* **8.** *tex.* yemək, korlamaq, xarab etmək; *Acid attacks metals Turşu metalı yeyir;* **9.** *id.* hücum etmək, hücuma keçmək

**attacker** [ə'tækə[r]] *n* hücumçu; hücum edən adam

**attain** [ə'teın] *v* **1.** çatmaq, yetişmək; *We attained the top of the mountain Biz dağın zirvəsinə çatdıq; He attained the age of ninety O, doxsan yaşına çatdı;* **2.** nail /müvəffəq olmaq, əldə etmək; **to ~ aims** məqsədə çatmaq / nail olmaq; *He attained the position of minister O, nazir vəzifəsinə çatdı / nail oldu;* **3.** hər hansı yaşa çatmaq

**attainability** [ə,teınə'bılıtı] *n* əldə edilə bilmə, mümkün olma, imkan; ~ **of certain knowledge** müəyyən bilik əldə etmə imkanı

**attainable** [ə'teınəbl] *adj* əldə edilə bilən, mümkün olan; **the highest pitch of perfection ~** kamilliyin mümkün olan ən yüksək nöqtəsi

**attainableness** [ə'teınəblnıs] *n* = **attainability**

**attainder** [ə'teındə[r]] *n hüq. arx.* ölüm cəzasına məhkum edilmiş və ya ağır cinayət işlətmə üzündən qanundan kənar edilmiş, lakin xarici ölkəyə qaçmış şəxsin mülki və əmlak hüquqlarından məhrum edilməsi

**attainment** [ə'teınmənt] *n* **1.** nailiyyət/ müvəffəqiyyət əldə etmə; *His attainments are many O, bir çox sahələrdə müvəffəqiyyət əldə edib;* **above/beyond** ~ əldə edilməz, əlçatmaz, mümkün olmayan; **2.** *adət. pl* bacarıq, bilik, bilgi; məziyyət; yaxşı cəhət; **a man of ~s** geniş biliyi olan adam; **a man of varied ~** hərtərəfli adam

**attar** ['ætə[r]] *n*: ~ **of roses** qızılgül yağı

**attempt**[1] [ə'tempt] *n* **1.** cəhd, təşəbbüs; ~ **to save *smb.'s* life** bir kəsin həyatını xilas etmək üçün təşəbbüs; **to make an** ~ cəhd etmək, təşəbbüs göstərmək; **2.** qəsd, qəsd etmə; sui-qəsd; ~ **upon the life of *smb.*** bir kəsin həyatına qəsd / sui-qəsd; *He made an attempt on his own life O öz həyatına qəsd etməyə cəhd göstərdi*

**attempt**[2] [ə'tempt] *v* **1.** səy etmək, təşəbbüs / cəhd göstərmək, cəhd etmək; **to ~ flying / to fly** uçmağa səy/cəhd etmək, uçmağa təşəbbüs göstərmək; **to ~ to climb the mountain** dağa çıxmağa/dırmanmağa səy etmək; **2.** *arx.* yoldan/başdan çıxarmaq, tovlamaq, aldatmaq, şirnikdirmək, tamahsılandırmaq

**attend** [ə'tend] *v* **1.** iştirak etmək, getmək, olmaq; **to ~ a lecture/ a meeting** mühazirədə/iclasda iştirak etmək; **to ~ a concert** konsertdə olmaq; **to ~ school** məktəbə getmək; **2. (to)** diqqət yetirmək, diqqətli olmaq; **to ~ to what is said** deyilənə diqqət yetirmək; *Please attend! Zəhmət olmasa, diqqət yetirin / diqqətli olun!;* **3.** qeydinə qalmaq; **to ~ to the education of *one's* children** uşaqların təhsilinin qeydinə qalmaq; **to ~ to *one's* own business** öz işinin qeydinə qalmaq; **4.** qulluq etmək, baxmaq *(xəstə haq.) She was attended by the best doctors Ona ən yaxşı həkimlər qulluq edirdi; Onu ən yaxşı həkimlər müalicə edirdi;* **5. (to)** xidmət etmək, xidmət göstərmək; **to ~ to a customer** müştəriyə xidmət etmək; **6.** müşayiət etmək; *They attended the party on their journey Onlar səyahət zamanı qrupu müşayiət etdilər; Three secretaries attended the president on his travels Prezidenti səfər zamanı üç katib müşayiət edirdi; Success attend you! Sənə/Sizə uğur olsun!*

**attendance** [ə'tendəns] *n* **1.** olma, iştirak etmə, iştirak; *Your attendance is necessary Sənin /Sizin iştirakın/iştirakınız vacibdir;* **2.** gələnlərin sayı, gəlmə, davamiyyət, davam etmə; *Attendance at school is compulsory Məktəbə davamiyyət məcburidir;* **poor** ~ pis davamiyyət; **3.** auditoriya, kütlə; tamaşaçı, camaat; *There was a large attendance at the meeting İclasda çoxlu camaat vardı;* **4.** svita, rəiyyət *(böyük bir şəxsin müşayiətçiləri)*; **5.** qulluq, xidmət; **medical ~** tibbi qulluq/ xidmət; **to be in ~ on *smb.*** bir kəsə xidmət/qulluq göstərmək, bir kəsin qulluğunda/xidmətində durmaq / olmaq;

◊ **to dance ~ on / upon *smb.*** bir kəsə yaltaqlıq etmək, bir kəsə qulluq göstərmək / yaltaqlanmaq

**attendant**[1] [ə'tendənt] *n* **1.** müşayiətçi, müşayiət edən şəxs, yoldaş; **2.** xidmətçi, xidmət göstərən şəxs; xəstəyə baxan *(qadın)*; **cloakroom ~** qarderobçu, paltarsaxlayan; biletyoxlayan *(teatrda)*; **3.** *pl* xidmət göstərən adamlar; xidmətçilər, nökərlər; **4.** svita *(böyük bir şəxsin müşayiətçiləri)*; **5.** iclasda, yığıncaqda və s. iştirak edən şəxs / adam

**attendant**[2] [ə'tendənt] *adj* **1.** eyni vaxtda baş verən/yaranan, doğan; ~ **circumstances** eyni vaxtda baş verən / yaranan vəziyyət; **war and its ~ horrors** müharibə və ondan doğan dəh-

şətlər, müharibə və onun yaratdığı dəhşətlər; *One of the attendant difficulties during the war was lack of food Müharibənin yaratdığı / doğurduğu çətinliklərdən biri ərzaq çatışmazlığı idi*; 2. xidmətçi, xidmət göstərən/edən, qulluq edən; **the ~ nurse** növbətçi tibb bacısı; **~ helpers** xidmət göstərən köməkçilər; **to be ~ on** ***smb.*** bir kəsin xidmətində olmaq, bir kəsə xidmət göstərmək/ etmək; 3. iştirak edən; **~ crowd** iştirak edən kütlə/ camaat

**attender** [ə'tendər] *n* qulluqçu, xidmətçi, nökər; qulluq göstərən, yaltaq

**attending physician** [ə'tendıŋfı'zıʃn] müalicə edən həkim, ordinator *(xəstəxanada, klinikada və s. palata və ya şöbəyə rəhbərlik edən həkim)*

**attention** [ə'tenʃn] *n* 1. diqqət, diqqətlilik; **to attract ~** diqqəti cəlb etmək/çəkmək; **to call/to draw** ***smb.'s*** **~ to** ***smth.*** bir kəsin diqqətini bir şeyə cəlb etmək; **to give** ***one's*** **~ to** ***smb./***to ***smth.*** bir kəsə/şeyə diqqət yetirmək; **to pay ~ to** ***smb./***to ***smth.*** bir kəsə / bir şeyə diqqət vermək; *You must pay attention to the teacher Sən /Siz müəllimə diqqət verməlisən/verməlisiniz;* **to slip** ***smb.'s*** **~** bir kəsin diqqətindən qaçmaq; **to compel ~** diqqəti özünə cəlb etmək; **to turn** ***one's*** **~ to** ***smb./*** **to** ***smth.*** diqqəti bir kəsə/bir şeyə yönəltmək; 2. qayğı; **to need ~** qayğı tələb etmək; *Old cars need a lot of attention to keep them working Köhnə maşınları saz saxlamaq üçün çox qayğı tələb olunur*; 3. *pl* iltifat göstərmə, meyl etmə *(qadına)*; **to pay ~s to a lady** qadına pərəstişkarlıq etmək; 4. farağat vəziyyət *hərb. Attention! Farağat!* **to come to ~ /to stand at ~** farağat dayanmaq; **to call to ~** farağat komandası vermək; *The officer ordered the men to stand at attention during the whole ceremony Zabit əsgərlərə əmr etdi ki, bütün mərasim boyu farağat komandası vəziyyətində dayansınlar / dursunlar*

**attentive** [ə'tentıv] *adj* 1.diqqətli; **to be ~ to** ***one's*** **duty** öz vəzifəsini icra etməkdə / yerinə yetirməkdə diqqətli olmaq; **an ~ audience** diqqətli auditoriya *(məruzəyə, mühazirəyə və s. qulaq asanlar)*; 2. qayğıkeş, qeydə qalan; *The girl was very attentive to her little brother Qız balaca qardaşına qarşı çox qayğıkeş idi;* 3. nəzakətli, xoşrəftar, iltifatlı; **to be ~ to ladies** xanımlara qarşı nəzakətli / iltifatlı olmaq

**attentively** [ə'tentıvlı] *v* diqqətlə, iltifatla, qayğıkeşliklə, nəzakətlə; **to listen ~** diqqətlə qulaq asmaq

**attentiveness** [ə'tentıvnıs] *n* 1. diqqətlilik, diqqət; 2. iltifatlılıq, iltifat, nəzakətlilik, nəzakət

**attenuant¹** [ə'tenjuənt] *n əcz.* qanı durulaşdırıcı maddə, durulaşdırıcı *(maye)*

**attenuant²** [ə'tenjuənt] *adj* durulaşdırıcı; zəifləşdirən

**attenuate¹** [ə'tenjuıt] *adj* 1. arıq, arıqlamış; **~ hands** arıq əllər; 2. sıyıqlaşdırılmış, durulaşdırılmış; **~ substance** sıyıqlaşdırılmış maddə

**attenuate²** [ə'tenjueıt] *v* 1. arıqlatmaq, zəifləşmək, əldən salmaq, üzmək; 2. əritmək, yumşaltmaq, sıyıqlatmaq; 3. küsdürmək, korlamaq; **to ~ appetite** iştahasını korlamaq / küsdürmək

**attenuated** [ə'tenjueıtıd] *adj* 1. arıqlamış, əldən düşmüş, üzülmüş; 2. əridilmiş, həll edilmiş; ərinmiş, həll olmuş; sıyıqlaşdırılmış, durulaşdırılmış, yumşaldılmış

**attenuating** [ə'tenjueıtıŋ] *adj* yumşaldıcı; **~ circumstances** yumşaldıcı hallar/səbəblər

**attenuation** [ə,tenju'eıʃn] *n* 1. arıqlama, əldən düşmə, üzülmə, haldan düşmə; 2. yumşaltma, yumşalma; 3. sıyıqlaşdırma, sıyıqlaşdırılma, sıyıqlaşma, durulaşdırma, durulaşma

**attest¹** [ə'test] *n* 1. sübut, dəlil; 2. bir şeyi sübut edən imza

**attest²** [ə'test] *v* 1. təsdiqləmək; təsdiq etmək *(imza atmaqla və ya and içməklə)*; **to ~ a signature** imzanı təsdiq etmək; 2. **(to)** şahidlik etmək, şəhadət vermək; 3. and içdirmək

**attestation** [,ætes'teıʃn] *n* 1. şahid ifadəsi; şahid ifadəsi vermə; 2. təsdiq etmə, təsdiq edilmə *(sənəd haq.)* 3. *hərb.* and içdirmə

**attested** [ə'testıd] *adj* təsdiq edilmiş/olunmuş; **~ copy** təsdiq olunmuş/edilmiş nüsxə; **~ document** təsdiq edilmiş / olunmuş sənəd

**attic** ['ætık] *n* çardaq; *mem.* mansarda *(çatıq altında çap tavanlı otaq)*

**attire¹** [ə'taıər] *n* geyim, paltar, libas, pal-paltar, üst-baş; **in formal ~** rəsmi libasda

**attire²** [ə'taıər] *v* geyindirmək, geydirmək; bəzəmək, zinət vermək; geyindirib-kecindirmək; **~d in blue/ in white/ in satin** mavi/ağ/atlaz geyinmiş; **gorgeously ~d** çox gözəl/çox yaxşı geyinmiş

**attitude** ['ætıtju:d] *n* 1. münasibət, mövqe; **friendly ~ towards** ***smb.*** bir kəsə qarşı dost münasibət/mövqe; *What is your attitude towards this question? Bu məsələyə sənin / sizin münasibətin / münasibətiniz necədir? I dislike her unfriendly attitude Mənim onun qeyri-səmimi münasibətindən xoşum gəlmir;* **wait-and-see ~** gözləmə mövqeyi; **~ of mind** təfəkkür tərzi; 2. duruş, poza, görkəm; **~ of pride/ arrogance** vüqarlı/təkəbbürlü duruş; **hesitating ~** qətiyyətsiz görkəm; **melancholy ~** fikirli/qayğılı görkəm; **to strike/to assume/to adopt an ~** qeyri-təbii/süni görkəm almaq

**attitudinize** [,ætı'tju:dınaız] *v* qeyri-təbii poza almaq, yalançı poza almaq *(diqqəti cəlb etmək üçün)*

**attorney** [ə'tə:nı] *n hüq.* vəkil; müvəkkil; hüquqşünas; ədliyyə orqanlarının məmuru; prokuror *(ABŞ-da)*; **~ general** baş prokuror

**attorneyship** [ə'tə:nıʃıp] *n* vəkil peşəsi; vəkil rütbəsi / vəzifəsi

**attract** [ə'trækt] *v* 1. cəzb etmək, özünə çəkmək; *Magnit attracts steel Maqnit dəmiri cəzb edir;*



*Salt attracts moisture Duz nəm(i) çəkir; Flowers attract bees Çiçəklər arıları cəlb edir;* 2. heyran/valeh/məftun/cəlb etmək; **to ~ attention** diqqəti cəlb etmək, diqqəti çəkmək; *The girl cried to attract attention Qız qışqırdı ki, diqqəti cəlb etsin, Qız diqqəti cəlb etmək üçün qışqırdı;* **to ~ admirers** pərəstişkarları məftun / valeh etmək; *The young boy was attracted by the beauty of the girl Qızın gözəlliyi gənc oğlanı valeh / məftun etmişdi*

**attraction** [ə'trækʃn] *n* 1. cazibə, cəzb etmə, cazibə qüvvəsi; **magnetic ~** maqnit cazibəsi; **Earth's ~** yerin cazibə qüvvəsi; **universe ~** ümumdünya cazibə qüvvəsi; **the ~s of a big city** böyük şəhərin cazibə qüvvəsi / cazibəsi; *Work has little attraction for me İş məni az cəzb edir;* 2. cazibədarlıq, məlahət; gözəllik, qəşənglik; lətafət, füsunkarlıq, gözəllik; *The girl possesses many attractions Qız çox məlahətlidir / cazibədardır/gözəldir;* 3. attraksion *(sirkdə və s. tamaşalarda ən maraqlı və əyləncəli nömrə)*

**attractive** [ə'træktıv] *adj* 1. füsunkar, cazibədar, məlahətli, cəzbedici; **~ smile** cazibədar / füsunkar / cazibəli təbəssüm; **~ offer** cəlbedici / aldadıcı təklif; **a most ~ girl** ən cazibəli/cazibədar qız; **~ prices** cəlbedici qiymətlər; 2.: **~ power** *fiz.* cazibə qüvvəsi

**attractively** [ə'træktıvlı] *adv* heyranlıqla, məftunluqla, füsunkarcasına, çox gözəl; *She sings attractively O, çox gözəl oxuyur*

**attractiveness** [ə'træktıvnıs] *n* cazibə qüvvəsi, cazibədarlıq, məlahət, məlahətlilik, füsunkarlıq

**attributable** [ə'trıbjutəbl] *adj* aid edilən, izah edilən; *Her illness is attributable to drink Onun xəstəliyi içki ilə izah edilir*

**attribute¹** ['ætrıbju:t] *n* 1. əsas əlamət, fərqləndirici xüsusiyyət; *Darkness is an attribute of night Qaranlıq gecənin əsas əlamətidir;* 2. simvol, atribut; *The sword is an attribute of the fighter Qılınc döyüşçünün atributudur; The crown is an attribute of kingship Tac kral hakimiyyətinin simvoludur;* 3. *qram.* təyin; *Attribute is one of the secondary parts of the sentence Təyin cümlənin ikinci dərəcəli üzvlərindən biridir;* 4. *fəls.* atribut, ayrılmaz xassə

**attribute²** ['ætrıbju:t] *v* **(to)** aid etmək, istinad etmək, ayağına yazmaq, izah etmək; *He attributed his success to hard work O öz nailiyyətini /müvəffəqiyyətini gərgin işlə izah etdi; This play is attributed to Shakespeare Bu pyes Şekspirə aid edilir, Bu pyes Şekspirin ayağına yazılır; This song is usually attributed to Bach Bu mahnı adətən Baxın adına çıxılır/Baxa aid edilir*

**attribution** [,ætrı'bju:ʃn] *n* 1. aid etmə, ehtimal edilmə, adına yazılma; atribusiya; *The attribution of this play to that famous poet was shown to be wrong Bu pyesi o tanınmış şairin adına yazmağın səhv olduğu aşkar edildi;* 2. kompetensiya, səlahiyyət

**attributive¹** [ə'trıbjutıv] *n qram.* təyin, atribut

**attributive²** [ə'trıbjutıv] *adj qram.* təyin, təyinedici, atributiv; **an ~ clause** təyin budaq cümləsi; **the ~ use of the noun** ismin təyin kimi işlənməsi

**attrition** [ə'trıʃn] *n* 1. sürtünmə; sürtülmə, sürtülüb yeyilmə; sürtülmüş yer, sürtük yer; 2. üzülmə, qüvvədən düşmə, tükənmə

**attune** [ə'tju:n] *v* **(to)** 1. həmahəng etmək, uyğunlaşdırmaq; vərdiş etdirmək; *You must attune your ears to modern music Sən/Siz qulağını/qulağınızı müasir musiqiyə vərdiş etdirməlisən / etdirməlisiniz;* 2. kökləmək *(musiqi aləti, radionu)*

**atypical** [ə'tıpıkəl] *adj* qeyri-tipik, qeyri-səciyyəvi, tipik/səciyyəvi olmayan

**aubergine** ['oubədʒi:n] *n bot.* badımcan

**auburn** ['ɔ:bən] *adj* sarışın, şabalıdı-qırmızımtıl *(saç haq.)*

**auction¹** ['ɔ:kʃn] *n* 1. auksion, hərrac; **to sell by ~, to put up to ~** *amer.* **to sell / to put at ~** auksiona/hərraca qoymaq, auksion/hərrac yolu ilə satmaq; *I will sell my house by auction Mən evimi hərraca qoyacam / hərrac vasitəsi ilə satacam; The house is for sale by auction Ev auksion / hərrac yolu ilə satılır, Ev hərraca qoyulub;* 2. *pl* hərrac/auksion yolu ilə satışlar

**auction²** ['ɔ:kʃn] *adj* auksion, hərrac; **~ sale** hərrac/ auksion satışı; **~ mart / room** auksion / hərrac zalı / otağı

**auction³** ['ɔ:kʃn] *v* auksion / hərrac yolu ilə satmaq

**auctioneer** [,ɔ:kʃə'nıər] *n* auksionist, auksionçu, auksioner

**audacious** [ɔ:'deıʃəs] *adj* 1. cəsur, cəsarətli, fədakar; **~ explorer** fədakar/cəsarətli tədqiqatçı/səyyah; 2. ötkəm, ədəbsiz, qaba, kobud; həyasız, sırtıq, utanmaz

**audaciousness** [ɔ:'deıʃəsnıs] *n* = **audacity**

**audacity** [ɔ:'dæsıtı] *n* 1. ötkəmlik, cəsarət, cürət, igidlik, qoçaqlıq; 2. həyasızlıq, abırsızlıq, sırtıqlıq

**audibility** [,ɔ:dı'bılıtı] *n* eşidilmə, eşidilmə dərəcəsi; eşidilmə imkanı, eşitmə imkanı; aydınlıq

**audible** ['ɔ:dəbl] *adj* eşidilən, eşidilə bilən, aydın, anlaşılan; *He was scarcely audible O güclə eşidilirdi;* **~ whisper** aydın eşidilən pıçıltı

**audibleness** ['ɔ:dəblnıs] *n* = **audibility**

**audibly** ['ɔ:dəblı] *adv* eşidilən bir tərzdə; açıq, aydın; **to speak ~** aydın/açıq danışmaq; *Her heart throbbed audibly Onun ürəyi eşidilə biləcək tərzdə döyünürdü, Onun ürəyinin döyünməsi aydınca eşidilirdi*

**audience** ['ɔ:djəns] *n* 1. tamaşaçılar, kütlə, dinləyicilər, auditoriya; **to perform before a large ~**

geniş / böyük kütlə qarşısında çıxış etmək; *The audience was / were very excited by the show Tamaşa tamaşaçıları çox həyəcanlandırdı;* 2. audensiya, qəbul; **private** ~ xüsusi qəbul; **to give/ to grant** ~ audensiya vermək, rəsmi qəbul etmək; **to be received in ~ by** *smb.* bir kəs tərəfindən rəsmi surətdə qəbul olunmaq; 3. *hüq.* işə baxmaq *(məhkəmədə)*

**audio** [ˈɔ:diou] *adj amer.* eşitmə; səs; ~ **frequency** eşitmə tezliyi

**audiometer** [ˌɔ:dɪˈɔmɪtəʳ] *n* audiometr *(eşitmə qabiliyyətini ölçmək üçün cihaz)*

**audit**[1] [ˈɔ:dɪt] *n* 1. yoxlama, yoxlanma; təftiş, təftiş etmə / edilmə; *The yearly audit takes place each December Hər dekabrda illik yoxlama keçirilir;* 2. balans *(bir idarə və ya müəssisənin müəyyən müddəti ərzindəki gəlir və çıxarının yekunu)*

**audit**[2] [ˈɔ:dɪt] *v* yoxlamaq, təftiş etmək *(mühasib kitabını, maliyyə hesabatını)*

**auditing** [ˈɔ:dɪtɪŋ] *adj:* ~ **committee** təftiş komissiyası

**audition**[1] [ɔ:ˈdɪʃn] *n* 1. dinləmə, qulaq asma; 2. eşitmə, eşitmə qabiliyyəti; 3. qulaq asma *(vokalistlərə, aktyorlara və s.)*; **first** ~ ilk tur *(konkurs və s.)*, ilk dinləmə

**audition**[2] [ɔ:ˈdɪʃn] *v* 1. dinləmək, qulaq asmaq *(vokalistlərə, aktyorlara və s.)* 2. sınaqdan keçmək *(vokalist, müğənni və s.)*; *I am auditioning for a part in the play tomorrow, and I hope I get it Mən pyesdə rol almaq üçün sabah sınaqdan keçəcəm və əminəm ki, buna nail olacam*

**auditor** [ˈɔ:dɪtəʳ] *n* 1. müfəttiş, yoxlayıcı *(haqq-hesabı, hesabat işlərini)*; 2. *hüq.* auditor *(keçmişdə hərbi məhkəmələrdə prokuror vəzifəsini ifa edən şəxs)*; 3. sərbəst dinləyici *(tədris müəssisələrində)*; 4. *arx.* dinləyici

**auditoria** [ˌɔ:dɪˈtɔrɪə] **auditorium** *sözünün cəm forması*

**auditorium** [ˌɔ:dɪˈtɔ:rɪəm] *n* tamaşa zalı, auditoriya

**auditory** [ˈɔ:dɪtərɪ] *adj anat.* eşitmə; ~ **acuity** eşitmə itiliyi; ~ **canal** eşitmə kanalı; ~ **nerve** eşitmə əsəbi; ~ **passage** eşitmə keçidi; ~ **difficulties** eşitmə çətinlikləri

**au fait** [ouˈfeɪ] *adj:* **to be ~ in / at** *smth.* bir şeydən yaxşı başı çıxmaq, bir şey haqqında geniş məlumatı olmaq

**au fond** [ouˈfɔ:ŋ] *adv fr.* əslində, mahiyyətcə, həqiqətdə; *The quarrel is, au fond, personal and not political Mübahisə, əslində siyasi deyil, şəxsi xarakter daşıyır*

**auger** [ˈɔ:gəʳ] *n* burğu, matqab

**aught** [ɔ:t] *n* mülk, əmlak; mülkiyyət, mal-mülk, xüsusi mülkiyyət

**augment**[1] [ɔ:gˈment] *n* artırma, çoxaltma, gücləndirmə, böyütmə

**augment**[2] [ɔ:gˈment] *v* artırmaq, çoxaltmaq, gücləndirmək, böyütmək; *He augments his wages by working in his free time O, boş vaxtında işləməklə əmək haqqını artırır*

**augmentation** [ˌɔ:gmenˈteɪʃn] *n* 1. artırma, artırılma, çoxaltma, çoxaltdırma, böyütmə, böyüdülmə, artma, artım, çoxalma; 2. əlavə etmə, üstünə artırma, əlavə; 3. *tib.* şiddətlənmə *(hərarət, simptom haq.)*

**augur**[1] [ˈɔ:gəʳ] *n* 1. falçı, kahin *(qədim Yunanıstanda)*; 2. məzəmmət / töhmət edən, danlayan, pisləyən, tənə vuran

**augur**[2] [ˈɔ:gəʳ] *v* qabaqcadan xəbər vermək/bildirmək, gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək; *This closeness augurs a thunderstorm Bu bürkü tufan olacağını xəbər verir; The lack of rain augurs trouble Yağışın olmaması fəlakətdən xəbər verir*

**augury** [ˈɔ:gjurɪ] *n* 1. əlamət, nişanə; 2. qabaqcadan hiss etmə, ürəyə damma, duyma; 3. fal açma, fala baxma; gələcəyi qabaqcadan xəbər vermə

**August** [ˈɔ: gəst] *n* avqust; **in** ~ avqustda

**august** [ɔ:ˈgʌst] *adj* 1. əzəmətli, möhtəşəm, böyük; hörmətkar, qorxu təlqin edən; ~ **personage** zəhmli/vahiməli şəxs 2. əlahəzrət

**auk** [ɔ:k] n zool. çistik *(Şimal qağayısı)*

**aunt** [a:nt] *n* xala, bibi; **great** ~ atanın/ananın əmisi/dayısı/xalası/bibisi qızı

**auntie** [ˈa:ntɪ] *n naz. for.* 1. xalacıq; 2. xalacan *(müraciət forması)*

**aunty** [ˈa:ntɪ] *n* = **auntie**

**aura** [ˈɔ:rə] *n* 1. hava, vəziyyət; qoxu; **an ~ of decay** çürüntü qoxusu; 2. zərif ətir / rayihə / iy

**aural** [ˈɔ:rəl] *adj* 1. qulaq; eşitmə; ~ **department** qulaq şöbəsi *(xəstəxanada)*; ~ **impression** eşitmə qavrayışı; ~ **surgeon** qulaq xəstəlikləri üzrə mütəxəssis; 2. akustik; ~ **beacon** akustik mayak

**aurally** [ˈɔ:rəlɪ] *adv* eşitmə ilə, şifahi, şifahi olaraq

**auricle** [ˈɔ:rɪkl] *n anat.* 1. qulaq seyvanı; 2. ürək qulaqcığı

**auricular** [ɔ:ˈrɪkjulə] *adj* 1. qulaq, eşitmə; 2. qulağa deyilmiş; 3. *anat.* ürək qulaqcığına aid olan

**auriferous** [ɔ:ˈrɪfərəs] *adj* tərkibində qızıl olan, qızıllı; ~ **goldfield** qızıl yatağı olan rayon / sahə; ~ **rock** tərkibində qızıl olan dağ süxuru

**aurora** [əˈrɔ:rə, ɔ:ˈrɔ:rə] *n* Avrora, dan, şəfəq

**auscultate** [ˈɔ:skəlteɪt] *v tib.* qulaq asmaq *(xəstəliyi təyin etmək üçün)*

**auscultation** [ˌɔ:skəlˈteɪʃn] *n* qulaq asma *(xəstəliyi təyin etmək məqsədi ilə)*

**auspice** [ˈɔ:spɪs] *n* 1. *pl* himayə, havadarlıq, himayəçilik; hamilik; **meeting under the ~s of the World Peace Council** Ümumdünya Sülh Şurasının himayəsi ilə çağırılmış iclas; 2. əlamət, nişanə; **under favourable ~s** əlverişli/ uğur qazanılacaq bir şəraitdə; qabaqcadan xəbər vermə, gələcəyi xəbər vermə *(adət. müsbət)*



**auspicious** [ɔ:sˈpɪʃəs] *adj* 1. əlverişli, münasib, yararlı, müvafiq; yaxşı, xoş; ~ **event /circumstance/beginning** əlverişli hadisə / vəziyyət / başlanğıc; ~ **moment** münasib/əlverişli an; 2. rəhmli, rəhmdil, mərhəmətli; xoşxasiyyət

**auspiciously** [ɔ:sˈpɪʃəslɪ] *adv* yaxşı, faydalı, əlverişli; *The year began auspiciously İl yaxşı / əlverişli tərzdə başlandı / başladı*

**Aussie**[1] [ˈɔ:sɪ] *n d.d.* avstraliyalı

**Aussie**[2] [ˈɔ:sɪ] *adj* Avstraliya; ~ **people** Avstraliya xalqı

**austere** [ɔ:sˈtɪəʳ] *adj* 1. ciddi, zabitəli, sərt, kəskin, acıqlı; **an ~ face** ciddi/acıqlı sifət; **an ~ look** kəskin/sərt baxış; **an ~ man** ciddi/zabitəli/acıqlı adam; 2. ağır, əzablı; asketik; ~ **life** ağır /əzablı həyat, asketik həyat; 3. adi, israfsız; ~ **repast** adi qida; 4. dəqiq, təmiz *(üslub haq.)*; 5. ağız büzüşdürücü, acı; ~ **wine** ağız büzüşdürücü / acı şərab

**austerity** [ɔ:sˈterɪtɪ] *n* 1. ciddilik, ciddiyyət, qətilik, zabitəlilik, zabitə; sərtlik, kəskinlik, şiddət; asketizm; 2. sadəlik; bəsitlik; 3. ağız büzücülük, büzücülük, ağız qamaşdırıcılıq

**Australasian**[1] [ˌɔstrəˈleɪʃn] *n* Avstraliya, Yeni Zelandiya və onların ətrafındakı adaların sakini və onların dili

**Australasian**[2] [ˌɔstrəˈleɪʃn] *adj* Avstraliya, Yeni Zelandiya, onların ətrafındakı adalara aid olan

**Australianizm** [ɔ:sˈtreɪljənɪzm] *n* avstralianizm *(Avstraliya sakinlərinin nitqi üçün xarakterik olan söz və ifadə)*

**Austrian**[1] [ˈɔ:strɪən] *n* avstriyalı

**Austrian**[2] [ˈɔ:strɪən] *adj* Avstriya; avstriyalı; ~ **people** Avstriya xalqı; **an ~ boy** avstriyalı oğlan

**Austro-** [ˈɔstrou] *Birləşmə tərkibində işlədilir:* The **Austro**-Hungarian empire Avstriya-Macarıstan imperiyası; **Austro**-Italian border Avstriya-İtaliya sərhədi

**autarchy** [ˈɔ:ta:kɪ] *n* I avtokratiya, mütləqiyyət

**autarchy** [ˈɔ:ta:kɪ] *n* II avtarkiya *(lazım olan hər şeyi millətin özünün istehsal etməsi)*

**autarky** [ˈɔ:ta:kɪ] *n* III = **autarchy** I

**authentic** [ɔ:ˈθentɪk] *adj* 1. əsl, həqiqi; orijinal; əslinə uyğun, əslinə mütabiq; **an ~ signature** əsl / əslinə mütabiq imza; **an ~ picture** orijinal /əslinə uyğun şəkil; **an ~ text** orijinal/əslinə uyğun mətn; 2. *hüq.* həqiqi, qanuni əsası olan, qanunla sübut edilən; 3. doğru, gerçək; etibarlı, mötəbər, səhih; ~ **news** doğru/mötəbər/səhih xəbər

**authentically** [ɔ:ˈθentɪkəlɪ] *adv* həqiqətən, doğrudan, həqiqi mənada, doğru, həqiqi, gerçək, səhih, dürüst

**authenticate** [ɔ:ˈθentɪkeɪt] *v* 1. təsdiq etmək, təsdiqləmək; sübut etmək; inandırmaq; 2. həqiqiliyini təsdiq etmək/təsdiqləmək; ~ **a signature** imzanın həqiqiliyini/həqiqi olduğunu təsdiq etmək; 3. şerin, şəklin və s.-nin müəllifini müəyyənləşdirmək; **to ~ the authorship of an old poem** qədim şerin müəllifini müəyyənləşdirmək

**authentication** [ɔ:ˌθentɪˈkeɪʃn] *n* təsdiq etmə/edilmə, təsdiqləmə *(sənəd və s. haq.)*; **the use of seals for ~ of a contract** müqavilənin doğruluğunu təsdiq etmək üçün möhürdən istifadə etmə

**authenticity** [ˌɔ:θenˈtɪsɪtɪ] *n* doğruluq, gerçəklik, həqiqilik, səhihlik, əsllik, orijinallıq; *The painting's authenticity is not in doubt, it is a real Rembrant Şəklin orijinallığına şübhə yoxdur, o həqiqətən də Rembrantındır*

**author** [ˈɔ:θəʳ] *n* 1. müəllif, avtor, yazıçı; ~**'s royalty** müəllif qonorarı; ~**'s copy** müəllif nüsxəsi; 2. yaradan, yaradıcı;

◊ *Choose an author as you choose a friend Müəllifi dost seçdiyin kimi seç*

**authoress** [ˈɔ:θərɪs] *n* qız/qadın müəllif

**authorial** [ɔ:ˈθourɪəl] *adj* müəllif; ~ **merits** müəllif xidməti

**authoritarian** [ɔ:ˌθɔrɪˈteərɪən] *adj* avtoritar *(korkoranə tabeçiliyə əsaslanan)*

**authoritative** [ɔ:ˈθɔrɪtətɪv] *adj* 1. nüfuzlu, mötəbər, sözükeçən; ~ **statement** mötəbər bəyanat; ~ **opinion** mötəbər/nüfuzlu fikir; 2. etibarlı, mötəbər; ~ **information** mötəbər /etibarlı məlumat; **to have** *smth.* **from an ~ source** mötəbər /nüfuzlu mənbədən məlumat almaq; **an ~ dictionary** etibarlı/ mötəbər lüğət; 3. amiranə, hökmlü, səlahiyyətli, səlahiyyəti olan; ~ **tone** amiranə /hökmlü ton; ~ **manner** hökmlü davranış

**authoritatively** [ɔ:ˈθɔrɪtətɪvlɪ] *adv* 1. ixtiyar sahibi kimi / olaraq; *I can state authoritatively that ... Mən ixtiyar sahibi kimi elan edə bilərəm ki,...* 2. hökmlə, əzmlə, cəsarətlə, qətiyyətlə

**authoritativeness** [ɔ:ˈθɔrɪtətɪvnɪs] *n* 1. nüfuz, etibar; 2. amirlik, hökmranlıq, hökm vermək xasiyyəti

**authority** [ɔ:ˈθɔrɪtɪ] *n* hakimiyyət; **supreme** ~ ali hakimiyyət; **executive** ~ icra hakimiyyəti; **the ~ of Parliament** Parlament hakimiyyəti; *The government is the highest authority in the country Hökumət ölkədə ən ali hakimiyyətdir;* 2. ixtiyar, səlahiyyət, vəkalət, hüquq; **to give / to receive ~ to do** *smth.* bir şey etmək üçün ixtiyar/səlahiyyət/vəkalət vermək/almaq; *What authority have you for entering this house? Hansı hüquqla/ixtiyarla sən/siz bu evə daxil olmusan/olmusunuz? Who gave you the authority to do this? Sənə / Sizə bunu etməyə kim səlahiyyət /ixtiyar verib?;* **to act on** *smb.***'s ~** bir kəsin vəkaləti ilə hərəkət etmək; 3. orqan, idarə; şöbə; 4. nüfuz, avtoritet; çəki, təsir; **to have ~ over/with** *smb.* bir kəsin yanında nüfuzu/avtoriteti olmaq, bir kəsin yanında nüfuza / avtoritetə malik olmaq; 5. avtoritet, böyük mütəxəssis; *She is an authority on phonetics O*

*fonetika sahəsində böyük mütəxəssisdir / avtoritetdir;* 6. əsas, səbəb; *What is your authority for that statement? Bu müddəa üçün sənin/sizin əsasın/əsasınız nədir?*

**authorization, -sation** [ˌɔ:θəraɪ'zeɪʃn] *n* **1.** səlahiyyət /vəkalət vermə; **2.** icazə vermə/verilmə; izin vermə / verilmə; ixtiyar vermə, icazə, sanksiya

**authorize, ise** ['ɔ:θəraɪz] *v* icazə / izin vermək; **to ~ the substitution** dəyişikliyə /dəyişiklik etməyə icazə vermək; **2.** vəkalət vermək; vəkil etmək, səlahiyyət vermək; **to ~ *smb.* to act for a person** bir şəxsin adından hərəkət etmək üçün bir kəsə səlahiyyət/vəkalət vermək; *I authorized Tom to act for me while I was abroad Mən xaricdə olanda Toma səlahiyyət verdim ki, mənim əvəzimə hərəkət etsin;* **3.** izah etmək, bəraət qazandırmaq; *His action is authorized by the situation Onun hərəkəti vəziyyətlə izah edilir;* **4.** *hüq.* leqallaşdırmaq, qanuniləşdirmək, qanuni olduğunu qəbul etmək

**authorized, -ised** ['ɔ:θəraɪzd] *adj* **1.** vəkil edilmiş; **~ agent** vəkil edilmiş agent; **2.** izin / icazə /yol /rüsxət verilmiş, təsdiq edilmiş; **~ edition** təsdiq edilmiş/icazə verilmiş nəşr; **3.** müəllifin icazəsi ilə buraxılmış nəşr; **~ translation** müəllif tərəfindən bəyənilmiş / təsdiq edilmiş tərcümə

**authorless** ['ɔ:θəlɪs] *adj* müəllifi olmayan, imzasız, anonim

**authorship** ['ɔ:θəʃɪp] *n* **1.** müəlliflik, avtorluq; **a book of doubtful ~** müəllifi şübhəli olan kitab; *The book's authorship is not known Bu kitabın müəllifi məlum deyil;* **2.** yazıçılıq peşəsi, yazıçılıq, ədiblik; **3.** mənbə, başlanğıc; **~ of crime** cinayətin mənbəyi

**auto**[1] ['ɔ:tou] *n* **automobile** *sözünün qısa forması*

**auto**[2] - ['ɔ:tou-] **(avto-)** *mürəkkəb sözlərin, xüsusən terminlərin tərkib hissəsi; Azərbaycan türkcəsində* **avto-***tərkib hissəsinə və* **öz-özünə** *sözünə uyğun gəlir;* **autobiography avtobioqrafiya, autograph avtoqraf; autoignition öz-özünə** alışan, **autoexcitation öz-özünə** induksiyalanma

**autobahn** ['ɔ:touba:n] *n* (*pl* **-en** [-ən]) avtostrada (*ikitərəfli avtomobil yolu*)

**autobiographic** ['ɔ:touˌbaɪou'græfɪk] *adj* avtobioqrafik

**autobiographical** ['ɔ:touˌbaɪou'græfɪkəl] *adj* = **autobiographic**

**autobiography** ['ɔ:toubaɪ'ɔgrəfɪ] *n* avtobioqrafiya, tərcümeyi-hal

**auto-change** ['ɔ:tətʃeɪndʒ] *n maqnitofonda lentə yazılmışların əllə dəyişmədən avtomatik olaraq oxunmasını idarə edən cihaz*

**auto-changer** ['ɔ:touˌtʃeɪndʒə'] *n* = **auto-change**

**autocracy** [ɔ:'tɔkrəsɪ] *n* mütləqiyyət, istibdad

**autocrat** ['ɔ:təkræt] *n* **1.** hökmdar, padşah; **2.** diktator, müstəbid/özbaşına adam

**autocratic** [ˌɔ:tə'krætɪk] *adj* mütləqiyyətçi, diktator

**autocratical** [ˌɔ:tə'krætɪkəl] *adj* = **autocratic**

**autocratically** [ˌɔ:tə'krætɪkəlɪ] *adj* diktator kimi, mütləqiyyətçi kimi

**autograph**[1] ['ɔ:təgra:f] *n* **1.** avtoqraf; *The little boys asked the footballer for his autograph Balaca oğlanlar futbolçudan avtoqraf istədilər;* **2.** əlyazmasının orijinalı

**autograph**[2] ['ɔ:təgra:f] *adj* müəllifin öz əli ilə yazılan; **~ will** vəsiyyət verənin öz əli ilə yazılmış vəsiyyətnamə

**autograph**[3] ['ɔ:təgra:f] *v* avtoqraf yazmaq, öz əli ilə imza atmaq; **~ed copy** avtoqraf yazılmış nüsxə

**automat** ['ɔ:təmæt] *n amer.* kafe-avtomat (*yeməkləri jeton atmaqla maşınlardan alınan yeməkxana*); *Let's eat in the automat today Gəlin bu gün kafe-avtomatda yeyək*

**automate** ['ɔ:təmeɪt] *v* avtomatlaşdırmaq, avtomatikləşdirmək

**automatic**[1] [ˌɔ:tə'mætɪk] *n* **1.** avtomatik mexanizm; **2.** avtomat silah

**automatic**[2] [ˌɔ:tə'mætɪk] *adj* **1.** avtomatik, avtomatlaşdırılmış, avtomat; **~ machine** avtomat / avtomatlaşdırılmış maşın, avtomat; **~ telephone** avtomat telefon; **~ telephone exchange** avtomatlaşdırılmış telefon stansiyası; **~ line** *tex.* avtomat / avtomatlaşdırılmış xətt; **~ rifle 1)** avtomat tüfəng; **2)** *amer.* əl pulemyotu **2.** qeyri-şüuri, qeyri-iradi, mexaniki; **~ blinking of the eyelids** qeyri-şüuri/qeyri-iradi/ mexaniki göz qırpma / kirpik çalma

**automatical** [ˌɔ:tə'mætɪkəl] *adj* = **automatic**

**automatically** [ˌɔ:tə'mætɪkəlɪ] *adv* **1.** avtomatik, avtomatik olaraq, öz-özünə; **2.** qeyri-şüuri, qeyri-ixtiyari

**automation** [ˌɔ:tə'meɪʃn] *n* avtomatlaşdırma, avtomatikləşdirmə

**automatism** [ɔ:'tɔmətɪzm] *n* avtomatizm, avtomatiklik

**automatize** [ɔ:'tɔmətaɪz] *v* avtomatlaşdırmaq, avtomatikləşdirmək

**automobile**[1] ['ɔ:təməbi:l] *n* avtomobil

**automobile**[2] ['ɔ:təməbi:l] *adj* avtomobil; **~ business** avtomobil işi; **~ transportation** avtomobillə yükdaşıma

**automobilist** [ˌɔ:tə'moubɪlɪst] *n* avtomobilist

**autonomist** [ɔ:'tɔnəmɪst] *n* muxtariyyətçi, muxtariyyət tərəfdarı

**autonomous** [ɔ:'tɔnəməs] *adj* muxtar, muxtariyyəti olan; **~ republic** muxtar respublika

**autonomy** [ɔ:'tɔnəmɪ] *n* **1.** muxtariyyət; **2.** özünüidarə hüququ; **3.** muxtar dövlət, muxtar vilayət

**autonym** ['ɔ:tənɪm] *n* **1.** əsl familiyası/ soyadı (*müəllifin*); **2.** müəllifin əsl soy adı ilə nəşr edilən kitab

**autopilot** [ˌɔ:tou'paɪlət] *n* avtopilot (*təyyarəni öz-özünə idarə edən aparat*)

**autoplasty** ['ɔ:təˌplæstɪ] *n tib.* avtoplastika (*bədənin xarab olmuş bir hissəsini başqa hissədən götürülən toxuma ilə bərpa etmə üsulu*)



**autopsy**[1] ['ɔ:təpsɪ] *n* meyiti yarma

**autopsy**[2] ['ɔ:təpsɪ] *v* meyiti yarmaq

**auto-racing** [ˌɔ:tou'reɪsɪŋ] *n* avtomobil sportu / idmanı, avtomobil yarışı

**autostrada** ['ɔ:təˌstra:də] *n* avtomagistral (*əsas avtomobil yolu*)

**autosuggestion** ['ɔ:tousə'dʒestʃn] *n* özünü inandırma, özünə təlqin etmə; *Can I really train myself out of my bad habits by autosuggestion? Mən həqiqətən də pis adətlərimi özünü inandırma yolu ilə tərgidə bilərəmmi?*

**autumn**[1] ['ɔ:təm] *n həm də məc.* payız; **late ~** payızdan xeyli keçmiş; *He has reached the autumn of his life O, ömrünün payızına çatmışdır*

autumn[2] ['ɔ:təm] *adj* payız; **~ sowing** *k.t* payız səpini; **~ fruit** payız meyvəsi; **~ month** payız ayı; **~ wind** payız küləyi

**autumnal** [ɔ:'tʌmnəl] *adj* **1.** *şair* payız; **~ leaves** payız yarpaqları; *It is getting autumnal Payız gəlir;* **~ equinox** payızda gecə ilə gündüzün tənləşməsi; **2.** payızda yetişən / çiçəklənən

**auxiliary**[1] [ɔ:g'zɪljərɪ] *n* **1.** köməkçi, yardımçı; **2.** *qram.* köməkçi fel; **3.** xarici vətəndaşlardan muzdla tutulmuş ordu

**auxiliary**[2] [ɔ:g'zɪljərɪ] *adj* **1.** köməkçi, yardımçı; **~ verb** *gram.* köməkçi fel; **~ engine** köməkçi / yardımçı mühərrik; **2.** ehtiyat; **~ landing field** *hərb.* ehtiyat aerodrom / təyyarə meydanı

**avail**[1] [ə'veɪl] *n* fayda, xeyir, mənfəət, qazanc; **of ~** faydalı, xeyirli, mənfəətli, yararlı, münasib, kara gələn; **of no ~, without ~** faydasız, xeyirsiz, mənfəətsiz, yararsız; *We tried and tried, but it was all to no avail Biz çox çalışdıq, lakin heç bir fayda olmadı*

**avail**[2] [ə'veɪl] *v* **1.** faydalı / xeyirli / yararlı olmaq; kömək etmək; *The medicine did not avail against the disease Dərman xəstəliyə kömək etmədi;* **2. (of)** istifadə etmək; *He availed himself of his position O öz vəziyyətindən istifadə etdi; You should avail yourself of every chance to improve your English İngilis dilini yaxşı öyrənmək üçün sən/siz hər cür imkandan istifadə etməlisən /etməlisiniz*

**availability** [əˌveɪlə'bɪlɪtɪ] *n* **1.** yararlılıq, faydalılıq, işə yarama, lazım olma, xeyirlilik, sərfəlilik; **2.** olma, mövcudluq, mövcud olma; **export ~** ixrac imkanları, ixrac mallarının mövcudluğu; **3.** *amer.* perspektivlik, məşhurluq, hamı tərəfindən tanınma (*prezidentliyə namizəd haq.*)

**available** [ə'veɪləbl] *adj* **1.** yararlı, əlverişli, faydalı, işəyarar, xeyirli, sərfəli; **2.** hazırda olan, mövcud, əldə olan; mövcud olan; **~ supplies** mövcud olan ehtiyat; **to make *smth.* ~** bir şeyi mümkün etmək; **by all ~ means** mövcud olan bütün vasitələrlə; *I am sorry, sir, those shoes are not available in your size Üzr istəyirəm, cənab, sizin ölçünüzdə ayaqqabı yoxdur;* **3.** etibarlı; qüvvədə olan, yararlı; *Tickets are available for five days Biletlər yalnız beş gün müddətinə etibarlıdır;* **4.** *amer.* məşhur, tanınmış (*prezidentliyə namizəd haq.*)

**avalanche** ['ævəla:nʃ] *n* **1.** *fr.* uçqun; **~ of snow** qar uçqunu; **2.** axın, sel; **~ of letters** məktub axını; **~ of words** söz axını

**avant-garde**[1] [ˌævɔ:ŋ'ga:d] *n fr.* avanqard, qabaqcıl dəstə

**avant-garde**[2] [ˌævɔ:ŋ'ga:d] *adj* avanqard; **~ painters** avanqard rəssamlar

**avarice** ['ævərɪs] *n* xəsislik, acgözlük, tamahkarlıq, gözüdoymazlıq, hərislik; simiclik; **insatiable ~** gözüdoymazlıq; **pecuniary ~** pula hərislik; **to hoard in ~** həddən artıq tamahkar / acgöz olmaq, ifrat dərəcədə qənaətkarlıq etmək

**avaricious** [ˌævə'rɪʃəs] *adj* tamahkar, acgöz, gözüdoymaz, xəsis, simic, həris

**avariciously** [ˌævə'rɪʃəslɪ] *adv* tamahkarlıqla, acgözlüklə, hərisliklə

**avaunt** [ə'vɔ:nt] *int.* *Rədd ol! İtil, itil buradan!*

**avenge** [ə'vendʒ] *v* intiqam/qisas almaq; **to ~ insult** təhqirə görə qisas almaq; **to ~ on *smb.*** bir kəsdən intiqam/qisas almaq; **to ~ oneself** öz qisasını almaq; *They avenged themselves on the enemy Onlar düşməndən qisaslarını aldılar*

**avengeful** [ə'vendʒful] *adj* intiqamçı, kinli, kin saxlayan

**avenger** [ə'vendʒə'] *n* intiqamçı, intiqam alan, qisasçı

**avenue** ['ævɪnju:] *n* **1.** küçə, xiyaban, alleya (*iki cərgə ağac*); **~ of limes** cökə alleyası; **2.** prospekt, geniş küçə (*xüs. ABŞ-da*); **3.** yol, vasitə; **~ to success/to fame / to wealth** müvəffəqiyyətə/şöhrətə/zənginliyə gedən/aparan yol; **~ of contact** əlaqə yaratmaq yolu/vasitəsi; **to explore every ~** bütün vasitələrdən/yollardan istifadə etmək; **to leave no ~ unexplored** bütün yollardan/imkanlardan istifadə etmək

**aver** [ə'və:'] *v* **(-rr-) 1.** israr/iddia/elan etmək; *He proudly averred that he needed no help O fəxrlə elan etdi ki, onun köməyə ehtiyacı yoxdur;* **2.** *hüq.* sübut etmək

**average**[1] ['ævərɪdʒ] *n* **1.** orta, orta rəqəm; **above /below the ~** orta rəqəmdən yuxarı / aşağı; *He is above average in his lessons O, dərslərində ortadan bir az yuxarıdır;* **on an/the ~** orta hesabla; *On average we receive 5 letters each day Orta hesabla biz hər gün beş məktub alırıq;* **2.** *riyaz.* ortaq bölən

**average**[2] ['ævərɪdʒ] *adj* **1.** orta; **~ temperature** orta temperatur; **~ rainfall** orta normada yağıntı; **~ output** orta səviyyədə məhsul buraxılışı; **~ life** orta ömür; **2.** adi, orta; **an ~ man** orta/ adi adam; **an ~ family** orta / adi ailə; **an ~ reader** adi oxucu

**average**[3] ['ævərɪdʒ] *v* **1.** ibarət olmaq. *His wages*

average 60 pounds Onun maaşı orta hesabla 60 funtdur; 2. riyaz. ortaq böləni tapmaq

**averse** [ə'və:s] adj rəğbəti / meyli / könlü / xoşu / ürəyi olmayan; əksinə / əleyhinə olan; ~ to war müharibəyə nifrət bəsləyən; ~ to do smth. bir şey etməyə meyli / xoşu/könlü olmayan; I am averse to punish people Mən adamlara cəza verilməsinin əleyhinəyəm

**aversion** [ə'və:ʃn] n 1. xoşa gəlməmə; antipatiya; to have a great ~ to/for smb. / smth. bir kəsə /bir şeyə dərin nifrət bəsləmək, bir kəsə / bir şeyə dərin nifrəti olmaq; to take an ~ to smb. bir kəsə qarşı nifrət hiss etmək 2. nifrət edilən / nifrətə layiq şəxs / şey

**avert** [ə'və:t] v 1. qarşısını almaq; to ~ war /danger/illness / accident müharibənin / təhlükənin /xəstəliyin/hadisənin qarşısını almaq; Accidents can be averted by careful driving Ehtiyatlı maşın sürmək bədbəxt hadisələrin qarşısını ala bilər; 2. çəkmək (gözünü, əlini və s.); to ~ one's gaze gözünü çəkmək; She averted her eyes from the terrible sight O, gözlərini dəhşətli səhnədən çəkdi; 3. yayındırmaq, sapdırmaq, azdırmaq (fikri)

**aviary** ['eɪvjərɪ] n quş damı, quşxana

**aviate** ['eɪvɪeɪt] v 1. təyyarədə uçmaq; 2. təyyarə sürmək, təyyarəni idarə etmək

**aviation¹** [.eɪvɪ'eɪʃn] n aviasiya (hava flotu)

**aviation²** [eɪvɪ'eɪʃn] adj aviasiya; ~ cadet təyyarəçilik məktəbinin kursantı; ~ engine təyyarə motoru / mühərriki

**aviator** ['eɪvɪeɪtə'] n təyyarəçi, təyyarəsürən

**aviculture** ['eɪvɪkʌltʃə'] n quşçuluq

**avid** ['ævɪd] adj 1. tamahkar, acgöz, həris; She is avid for praise O, tərifə hərisdir / tərifi çox sevir; 2. ehtirasla arzu edən, həsrətində olan, can atan; susamış, ehtiraslı; ~ of power / of fame hakimiyyət / şöhrət həsrətində olan; hakimiyyətə / şöhrətə can atan; ~ for the discovery inadla / israrla kəşfə can atan

**avidity** [ə'vɪdɪtɪ] n acgözlük, hərislik; to eat with ~ acgözlüklə/hərisliklə yemək; to read with ~ acgözlüklə/hərisliklə oxumaq

**avidly** ['ævɪdlɪ] adj 1. acgözlüklə, tamahkarlıqla, tamahkarcasına; 2. böyük həvəslə/şövqlə/ hərarətlə

**avital** [ə'vaɪtəl] adj arx. qədim, köhnə, dədə-baba; ~ customs qədim/köhnə adətlər, dədə-baba adətləri

**avitaminosis** [ə'vaɪtəmɪ'nousɪs] n tib. avitaminoz (vitaminsizlik xəstəliyi)

**avocation** [.ævou'keɪʃn] n 1. peşə, sənət; She is a musician by avocation O, sənətinə görə musiqiçidir; 2. məşğuliyyət, hobbi; Reading is my avocation Oxumaq mənim məşğuliyyətimdir / hobbimdir

**avoid** [ə'vɔɪd] v 1. çəkinmək, qaçınmaq, özünü gözləmək, kənar gəzmək; to ~ smb. bir kəsdən qaçmaq/kənar gəzmək, yayınmaq; to ~ danger təhlükədən özünü gözləmək, təhlükədən qaçınmaq; to ~ doing smth. bir şeyi etməkdən çəkinmək; to ~ some place bir yerdən kənar gəzmək; She avoided answering my questions O mənim suallarıma cavab verməkdən yayındı; 2. hüq. ləğv etmək; to ~ a sentence hökmü ləğv etmək; to ~ an agreement müqaviləni ləğv etmək

**avoidable** [ə'vɔɪdəbl] adj qaçınması mümkün olan, kənar gəzilə bilən

**avoidance** [ə'vɔɪdəns] n 1. çəkinmə, qaçınma; kənar gəzmə, özünü gözləmə; uzaqlaşma, kənara çıxma, qaçma; ~ of danger təhlükədən qaçma/ uzaqlaşma / qaçınma; 2. hüq. ləğv etmə; the ~ of the marriage kəbini ləğv etmə; 3. arx. vakansiya (idarələrdə və s. boş qalan yer, vəzifə)

**avoidless** [ə'vɔɪdlɪs] adj şair. labüd, qaçılmaz, zəruri, qabağıalınmaz

**avow** [ə'vau] v 1. etiraf etmək; açıq elan etmək; to ~ one's errors öz səhvini etiraf etmək; to ~ a fault günahı etiraf etmək; to ~ one's determination to fight to the end sona qədər mübarizə aparmaq haqqında öz qətiyyətini açıq elan etmək; He avowed himself (to be) a Christian O özünün xristian olduğunu açıq elan etdi; 2. hüq. hər-hansı bir faktı təsdiq etmək

**avowal** [ə'vauəl] n açıq etiraf; He made (an) avowal of his intentions O öz niyyətlərini açıq etiraf etdi

**avowed** [ə'vaud] adj hamıya məlum olan, hamı tərəfindən etiraf edilən, açıq etiraf edilən; an ~ enemy hamı tərəfindən etiraf edilən / hamıya məlum olan düşmən

**avowedly** [ə'vauɪdlɪ] adj açıqca, açıqdan-açığa; hamıya məlum olan; to be ~ in the wrong açıqca/açıqdan-açığa səhv etmək; He is avowedly my enemy O açıqdan-açığa mənim düşmənimdir

**avuncular** [ə'vʌŋkjulə'] adj d.d. əmi, dayı; ~ advice dayı/əmi məsləhəti; I really don't like avuncular advice from someone no older than I am! Mənim özümdən kiçik əmi-dayı məsləhətindən əsla xoşum gəlmir

**avuncularly** [ə'vʌŋkjuləlɪ] adv əmi/dayı kimi

**await¹** [ə'weɪt] n 1. arx. pusqu, marıq, bərə, tələ, tor; 2. sayıqlıq, ehtiyatlılıq, ehtiyat

**await²** [ə'weɪt] v 1. gözləmək; to ~ smb. bir kəsi gözləmək; to ~ smth. bir şeyi gözləmək; to ~ smb.'s answer bir kəsin cavabını gözləmək; I am awaiting your answer Mən sənin / sizin cavabını / cavabınızı gözləyirəm 2. qarşıda durmaq, gözləmək; Death awaits all men Bütün insanları ölüm gözləyir

**awake¹** [ə'weɪk] adj 1. oyaq, ayıq, oyanmış; to be ~ oyaq/ayıq olmaq; to lie ~ all night bütün gecə oyaq qalmaq / olmaq, bütün gecə yatmamaq; 2. aydın başa düşən, ehtiyatlı; sayıq; to be ~ to the danger təhlükəni aydın başa düş-



mək; He is not awake to his opportunity O, imkanı əldən buraxır

**awake²** [ə'weɪk] v (pt. awoke; pp. awoke, awaked) 1. oyatmaq, ayıltmaq; to ~ smb. bir kəsi oyatmaq; to ~ interest in smb. bir kəsdə maraq oyatmaq; 2. oyanmaq, ayılmaq; canlanmaq; to ~ out of a dream yuxudan ayılmaq

**awaken** [ə'weɪkən] v 1. oyatmaq; doğurmaq; to ~ jealousy/suspicion qısqanclıq/şübhə oyatmaq; 2. şair. ayılmaq, oyanmaq

**awakening** [ə'weɪknɪŋ] n oyanma, ayılma

**award¹** [ə'wɔ:d] n 1. mükafat; to give ~ mükafat vermək; 2. vermə, verilmə (mükafat və s.); 3. hüq. arbitraj qərarı, qərar (məhkəmənin)

**award²** [ə'wɔ:d] v 1. təltif etmək, mükafat vermək, mükafatlandırmaq, bəxş etmək; 2. vermək; to ~ smb. the first prize bir kəsə birinci mükafat vermək; to ~ additional time id. əlavə vaxt vermək; 3. hüq. qərar çıxartmaq; to ~ a new sentence yeni hökm çıxarmaq; The judge awarded her $ 500 damages Hakim ona 500 dollar məbləğində kompensasiya barədə hökm çıxartdı

**aware** [ə'weə'] adj başa düşən, bilən; məlumatlı, məlumatı olan; to be ~ of danger təhlükəni başa düşmək, təhlükə haqqında xəbəri/xəbərdar olmaq; to be ~ of one's uselessness özünün faydasız olduğunu başa düşmək / hiss etmək

**awash** [ə'wɔʃ] adj 1. suyun üzündə/üstündə; dalğada; The box floats awash Qutu suyun üzərində üzür; 2. su ilə yuyulan; su ilə yuyulub aparılmış; Everything on the deck was awash Göyərtədə olan hər şeyi su yuyub aparmışdı; 3. su basmış, su altında qalmış; ~ with icy water buz kimi soyuq su basmış

**away¹** [ə'weɪ] adj 1. iştirak etməyən, olmayan; to be ~ olmamaq, iştirak etməmək, gəlməmək, getmək; He is away from home O, evdə yoxdur, O, evdən gedib; 2. aralı, aralı məsafədə; a small town ten miles ~ from here buradan on mil aralı olan kiçik şəhər; 3. id. öz meydançasında keçirilməyən (oyun haq.); home and ~ games öz meydançasında və özgə meydançasında keçirilən oyunlar; Is the next match at home or away? Gələn oyun öz meydançamızda, ya özgə meydançasında keçiriləcək?

**away²** [ə'weɪ] adv 1. Bir yerdən/məkandan uzaqlaşmanı bildirir; kənara, uzağa, o yana; to go ~ getmək, çıxıb getmək; to run ~ qaçmaq, qaçıb getmək; to throw ~ atmaq, tullamaq (bir kənara); to lay ~ kənara qoymaq; 2. Uzaqlıq bildirir: 1) məkanca; uzaq; ~ from home evdən uzaqda; far ~ uzaqda; ~ off amer. uzaqda; 2) zamanca; çoxdan; ~ back lap çoxdan; 3. Yox / Qeyb olma bildirir; to boil ~ qaynayıb yox olmaq (su və s.); to pass ~ ölmək; to waste ~, to pine ~ arıqlamaq, zəifləmək; qurumaq, solmaq; to make ~ with smb./with smth. bir kəsi /şeyi yox/ məhv etmək; She made away with herself O özünə qəsd etdi / intihar etdi; He cut away the dead branch O, qurumuş budağı kəsib atdı; 4. Bir şeyi istifadə üçün başqasına verməyi bildirir; to give ~ smth. to smb. bir şeyi başqasına vermək (istifadə üçün) ; to give ~ a secret sirri vermək; 5. Hərəkətin davam etdiyini bildirir; to work ~ işi davam etdirmək, to fire ~ atəşi davam etdirmək; 6. Mənanı qüvvətləndirmək məqsədilə işlədilir; dərhal, təxirə salmadan: Say away! Dərhal de!/deyin! Right! Straight away! Dərhal! Cəld!
◊ far out and ~ şübhəsiz, müqayisəsiz; This is far out and away the best example Bu şübhəsiz ən yaxşı misaldır

**away-team** [ə'weɪ'ti:m] n id. qonaq komanda

**awe¹** [ɔ:] n qorxu və təəccüblə qarışıq hörmət hissi; to keep / to hold in ~ qorxu və təəccüb hissi ilə qarışıq bir vəziyyətdə saxlamaq; She always stood in awe of her father O həmişə atasına qorxu və təəccüblə qarışıq bir hörmət bəsləyirdi

**awe²** [ɔ:] v qorxu və təəccüblə qarışıq hiss yaratmaq

**aweary** [ə'wɪərɪ] adj yorğun, yorulmuş, əldən düşmüş, üzülmüş

**awearied** [ə'wɪərɪd] adj yorğun, yorulmuş

**a-week** [ə'wɪ:k] adv hər həftə, həftədə bir

**aweless** ['ɔ:lɪs] adj 1. qorxmaz, qoçaq, cəsarətli; 2. hörmətsiz, sayğısız, hörmət etməyən, adamsaymayan

**awesome** ['ɔ:səm] adj 1. qorxu yaradan / törədən; qorxulu, vahiməli; 2. hörmətkar, ehtiramlı, hörmətli, möhtərəm

**awful** ['ɔ:fl] adj 1. dəhşətli, qorxulu, qorxunc, müdhiş, vahiməli; ~ tragedy dəhşətli faciə; ~ storm dəhşətli tufan; ~ cold dəhşətli /müdhiş soyuq; The pain was awful Ağrı dəhşətli /müdhiş idi; 2. çox pis; ~ weather çox pis hava

**awfully** [ɔ:fəlɪ] adv olduqca, çox, həddən artıq, son dərəcə; to be ~ sorry çox təəssüflənmək; to be ~ glad həddindən artıq şad olmaq; to be ~ interested son dərəcə maraqlanmaq

**awhile** [ə'waɪl] adv az vaxt, qısa müddət; bir az; Wait awhile! Bir az gözlə!/gözləyin! We rested awhile at the side of the road Biz yolun kənarında bir az dincəldik

**awkward** ['ɔ:kwəd] adj 1. yöndəmsiz, biçimsiz, təhərsiz, bacarıqsız, ləng, ağır; ~ movement yöndəmsiz hərəkət; ~ gait ləng / ağır yeriş; ~ time namünasib vaxt; He is still awkward with a knife and fork and drops food at each meal O hələ də çəngəl-bıçağı əlində saxlaya bilmir və hər dəfə yeməyi yerə salır; to be ~ in one's speech ləng danışmaq; sərbəst danışa bilməmək; to be ~ with one's hands əlini hara qoymağı bilməmək; 2. narahat, namünasib, münasib olmayan; ~ door namünasib/naqolay qa-

pı; ~ **handle** narahat / namünasib dəstək; 3. çətin, ağır zəhmətli, müşkül; ~ **situation** çətin /ağır vəziyyət; ~ **question** çətin sual; **to feel** ~ **with** *smb.* bir kəslə özünü narahat hiss etmək; 4. təhlükəli, çətin *(adam haq.)*; ~ **blow** təhlükəli zərbə; *He is an awkward customer Onunla iş görmək çətin məsələdir*

**awkwardly** ['ɔ:kwədlı] *adv* **1**. yöndəmsiz, biçimsiz; naqolay, kobudcasına; tutarsız; rabitəsiz; **2**. narahat, ağır, çətin

**awkwardness** ['ɔ:kwədnıs] *n* **1**. yöndəmsizlik, ağırlıq, lənglik, biçimsizlik; 2. narahatlıq, naqolaylıq

**awl** [ɔ:l] *n* biz *(alət)*

**awn** [ɔ:n] *n bot.* qılçıq *(sünbüldə)*

**awned** [ɔ:nd] *adj bot.* qılçıqlı; ~ **wheat** qılçıqlı buğda

**awning** ['ɔ:nıŋ] *n* tent, örtü, günlük, talvar, çardaq

**awningless** ['ɔ:nıŋlıs] *adj* tentsiz, günlüksüz

**awnless** ['ɔ:nlıs] *adj bot.* qılçıqsız; ~ **wheat** qılçıqsız buğda

**awoke** [ə'wouk] **awake** *felinin pt forması*

**awoken** [ə'woukən] **awake** *felinin pp forması*

**awry**[1] [ə'raı] *adj* 1. əyri, qıyqac, çəp; **a face** ~ **with pain** ağrıdan əyilmiş üz; 2. yanlış, düzgün olmayan; pis; uğursuz

**awry**[2] [ə'raı] *adv* 1. çəp, çəpəki, çəpinə, qıyqac, köndələn, əyri-əyri, əyrisinə; **to look** ~ çəpinə /çəpəki/əyri-əyri baxmaq; 2. yanlış olaraq, düzgün olmayaraq; qeyri-düzgün, yanlış; pis; uğursuz, müvəffəqiyyətsizliklə; *Our plans have gone awry Bizim planlarımız baş tutmadı /alt-üst oldu;* **to go/to run/to step/to walk** ~ doğru yoldan sapmaq /çıxmaq

**ax**[1] [æks] *n amer.* = **axe**[1]

**ax**[2] [æks] *v amer.* = **axe**[2]

**axe**[1] [æks] *n* 1. balta; 2. boynunu vurma; *He died by the axe Onun boynunu vurdular;*

◊ **to lay the ~ to the root of** *smth.*, **to set the ~ to** *smth.* bir şeyi yerli-köklü məhv etmək /dağıtmaq; **to hang up** *one's* ~ işdən əl götürmək/çəkmək, işi dayandırmaq; **to fit/to put the ~ in/on the helve** çətinliyin öhdəsindən gəlmək, tapşırığı həll etmək; **to send the ~ after the helve** son ümidlə riskə getmək, ümidsiz işi görmək üçün canfəşanlıq etmək; **to get the** ~ boynu vurulmaq

**axe**[2] [æks] *v* **1**. baltalamaq, balta ilə işləmək /kəsmək; **2**. xəbər vermədən və qəflətən işdən / yarışçıların siyahısından və s.-dən çıxarmaq

**axe-man** ['æksmən] *n* (*pl* **-men** [-mən]) baltaçı, odunçu, ağackəsən

**axiom** ['æksıəm] *n* aksioma

**axiomatic** [ˌæksıə'mætık] *adj* aksiomatik, aydın, aşkar

**axiomatical** [ˌæksıə'mætıkəl] *adj* = **axiomatic**

**axiomatically** [ˌæksıə'mætıkəlı] *adv* aksiomatik olaraq, aydın olaraq

**axis** ['æksis] *n* ox; **terrestrial** ~ yer kürəsinin oxu

**axle** ['æksl] *n tex.* ox, mehvər; **front** ~ qabaq ox; **rear** ~ arxa / dal ox

**ax-man** ['æksmən] *n* = **axe-man**

**Azerbaijan** [a:ˌzə:baı'dʒa:n] *adj* Azərbaycan; ~ **Republic** Azərbaycan Respublikası

**Azerbaijanian** [a:ˌzə:baı'dʒa:njən] *adj* = **Azerbaijan**

**Azerbaijani** [ˌa:zə:baı'dʒa:nı] *n* 1. azərbaycanlı; **the** ~ *top.i* azərbaycanlılar; 2. Azərbaycan dili

**azimuth**[1] [æzıməθ] *n astr.* azimut *(meridian müstəvisi ilə müşahidə edilən göy cisminin içərisindən keçən vertikal müstəvi arasındakı bucaq)*; **magnetic** ~ maqnit azimutu

**azimuth**[2] ['æzıməθ] *adj*: ~ **compass** azimut kompası; ~ **sight** pelengator *(gəminin, təyyarənin və s. olduğu yeri müəyyən etmək üçün cihaz)*

**azote** [ə'zout] *n kim.* azot

**azotic** [ə'zɔtık] *adj kim.* azot; ~ **acid** azot turşusu

**azotize** [ə'zoutaız] *v kim.* azotlamaq, azot vurmaq / hopdurmaq

**Azrael** ['æzreıəl] *n* Əzrail *(ölüm mələikəsi - müsəlman və yəhudilərə görə)*

**azure**[1] ['æʒəʳ] *n* göy rəng, mavi rəng

**azure**[2] ['æʒəʳ] *adj* göy rəngdə, mavi, laciverd; **a dress of ~ silk** mavi/laciverd rəngdə ipək don

**azurine** ['æʒuraın] *adj* solğun-mavi, boz-mavi



# Bb

**B b** [bi:] *n* (*pl* **B's, b's** [bi:z] **1**. *ingilis əlifbasının 2-ci hərfi*; *There are three b's in* **bubble Bubble** *sözündə üç b hərfi var;* 2. *amer.* qiymət "yaxşı"; **a B in Geography** coğrafiyadan "yaxşı"; *I have got a B in Literature Mən ədəbiyyatdan "yaxşı" almışam;* 3. ikinci dərəcəli, ikinci qrup; **B grade** ikinci növ / dərəcə;

◊ **not to know B from a bull's foot** heç şey/nə bilməmək; **the three Bs** böyük üçlük *(Bax, Bethoven, Brams)*

**baa**[1] [ba:] *n* mələmə *(qoyun)*

**baa**[2] [ba:] *v* mələmək *(qoyun)*

**babble**[1] ['bæbl] *n* **1**. vağ-vuğ *(uşaq danışığı)*; **child's** ~ uşaq vağ-vuğu; 2. öz-özünə danışma; donquldanma, burun altında danışma; *I could not make out his babble Mən onun donqultusunu anlaya bilmədim;* 3. boş söhbət/ danışıq, cəfəngiyyat, boşboğazlıq, çərənçilik; *She can't stand the babble of her neighbours O, qonşularının cəfəngiyyatına dözə bilmir;* 4. anlaşılmaz səs-küy/hay-küy; **a ~ of voices** anlaşılmaz səs-küy; 5. şırıltı, şırıldama; **the ~ of the brook** çayın şırıltısı; 6. civilti, cikkilti; **the ~ of birds** quşların civiltisi / cikkiltisi

**babble**[2] ['bæbl] *v* **1**. vağ-vuğ etmək *(uşaq)*; **2**. donquldanmaq, öz-özünə danışmaq, burnunun altında danışmaq, anlaşılmaz danışmaq, anlaşılmaz bir tərzdə / surətdə danışmaq, aydın danışmamaq; *He babbled something in response Cavab olaraq o nəsə donquldandı;* 3. naqqallıq /boşboğazlıq etmək, çərənləmək, laqqırtı vurmaq; *He babbled without stopping O, dayanmadan çərənlədi /boşboğazlıq etdi;* 4. ağzından qaçırmaq, açıb söyləmək, açmaq *(sirri)*; **to ~ (out) a secret** sirri ağzından qaçırmaq; 5. xoşagəlməyən səs çıxarmaq; 6. şırıldamaq *(su haq.)*; 7. civildəmək, cik-cik etmək; səs-küy salmaq *(quş haq.)*

**babbler** ['bæbləʳ] *n* **1**. boşboğaz, çoxdanışan, çərənçi; **2**. sirr saxlaya bilməyən, ağzıboş; **3**. hürən it

**babbling** ['bæblıŋ] *adj* **1**. boşboğaz, naqqal, çoxdanışan, çərənçi; söhbətcil; **2**. şırıltılı, şırıldayan; ~ **brook** şırıltılı çay

**babe** [beıb] *n* **1**. *şair.* çağa, uşaq; ~ **of love** bic, kəbinsiz doğulan uşaq; **2**. *amer. d.d.* gözəl /qəşəng qız, nazənin;

◊ **~s in the wood** sadəlövh/tez inanan adamlar; **~s and sucklings** sadədil/ sadəlövh adamlar; **a mere ~ in the ways of the world** heç bir həyat təcrübəsi olmayan adam

**babehood** ['beıbhud] *n şair.* = **babyhood**

**babel** ['beıbl] *n* hay-küy, çığır-bağır, həngamə, mərəkə, qiyamət, ərəsat; qarmaqarışıq, qarışıqlıq; *What a babel! Nə hay-küydür!*

**baby**[1] ['beıbı] *n* **1**. çağa, uşaq; **the ~ of the family** ailənin uşağı/kiçiyi; 2. bala *(heyvanların və quşların)*; 3. qrupda ən kiçik; **the ~ of the class** sinfin ən kiçiyi; 4. kiçikqabaritli maşın

**baby**[2] ['beıbı] *adj* **1**. uşaq; ~ **clothes** uşaq paltarı; ~ **act** uşaq hərəkəti; **2**. balaca; **a ~ car** balaca maşın; ~ **moon** yerin süni peyki; ~ **carriage / buggy** *amer.* uşaq arabası; 3. bala; **a ~ monkey** bala meymun

**baby**[3] ['beıbı] *v* (*pt pp* **-ied**) uşaq kimi yanaşmaq, həddən artıq qayğı və diqqət yetirmək, əzizləmək, ərköyün böyütmək; *He always babies his old car O həmişə köhnə maşınını uşaq kimi əzizləyir*

**babyhood** ['beıbıhud] *n* **1**. körpəlik/uşaqlıq dövrü; **in my** ~ körpəlik/uşaqlıq dövrümdə; **2**. *top.i* balaca uşaqlar, körpələr; 3. uşaqlıq, uşaq hərəkəti; *This is no place for babyhood Burada uşaq hərəkətinə yer yoxdur, Bura zarafat yeri deyil*

**babyish** ['beıbııʃ] *adj* **1**. uşaq, körpə; **to have a ~ look** uşaq kimi görünmək; uşağa oxşamaq / bənzəmək; 2. sadə, uşağın başa düşə biləcəyi; *It's a babyish problem Bu çox asan problemdir, Bu problemi uşaq da həll edə bilər;* 3. səfeh, sadəlövh, sarsaq, axmaq, ağılsız, uşaqlıq edən; *What a babyish thing to do? Bu nə uşaq hərəkətidir, edirsən?*

**babyism** ['beıbıızm] *n* **1**. *top.i* balacalar, körpələr; 2. uşaqların işlətdiyi söz və ifadələr

**baby-like**[1] ['beıbılaık] *adj* uşaq kimi, uşağa oxşar / bənzər

**baby-like**[2] ['beıbılaık] *adv* uşaqcasına, uşaq kimi; **to speak** ~ uşaq kimi danışmaq

**baby-minder** ['beıbıˌm aındəʳ] *n müvəqqəti olaraq pulla uşağa baxan qadın və ya məktəbli qız*

**baby-sitter** ['beıbıˌsıtəʳ] *n* = **baby-minder**

**baby-snatcher** ['beıbıˌsnætʃəʳ] *n* uşaq oğrusu, uşaq oğurlayan adam

**baby-snatching** ['beıbıˌsnætʃıŋ] *n* uşaq oğurluğu

**baby-talk** ['beıbıˌtɔ:k] *n* **1**. uşaq danışığı, uşaq nitqi; danışmağa başlarkən uşaqların çıxardığı nitqəoxşar səslər; **2**. böyüklərin uşaqları təqlid edərək onlara dediyi səs və ya sözlər *(uşağın danışmağa başladığı dövrdə)*

**baby-tooth** ['beıbıˌtu:θ] *n* süd dişi

**baccalaurean** [ˌbækə'lɔ:rıən] *adj* subaylıq; ~ **life** subaylıq həyatı

**baccalaureate** [ˌbækə'lɔ:rıət] *n* **1**. bakalavr dərəcəsi, bakalavrlıq; **2**. subay kişi

**bachelor** ['bætʃələʳ] *n* **1**. subay kişi; **old** ~ evlən-

məmiş subay kişi; *He is a bachelor O, subaydır, O, evli deyil;* 2. bakalavr; **B. of Arts** humanitar elmlər üzrə bakalavr; **~'s degree** bakalavr dərəcəsi

**bachelor girl** ['bætʃələ.gə:l] *n* ərsiz arvad *(xüs. gənc və müstəqil)*

**bachelorhood** ['bætʃələhud] *n* 1. subaylıq həyatı; 2. bakalavr dərəcəsi; **to receive *one's* ~** bakalavr dərəcəsi almaq

**bachelorship** ['bætʃələʃıp] *n* 1. = **bachelor hood;** 2. humanitar elmlər üzrə bakalavr dərəcəsi

**bacillary** ['bæsılərı] *adj* basillyar, basilli

**bacilli** [bə'sılaı] *n* **bacillus** *isminin cəmi*

**bacilli-carrier** [bə'sılaı.kærıəʳ] *n* basildaşıyan, basilyayan

**bacilliform** [bə'sılıfɔ:m] *adj* basilə oxşayan, basili xatırladan

**bacillus** [bə'sıləs] *n (pl* **-li**) basil *(çöpşəkilli mikrob)*

**back**[1] [bæk] *n* 1. kürək, arxa, dal; **broad ~** enlikürək; **to carry *smth.* on *one's* ~** bir şeyi dalında/kürəyində aparmaq; **to lie on *one's* ~** arxası üstə/dalı üstə uzanmaq; *He was on his back and looking at the stars O, arxası üstə uzanıb ulduzlara baxırdı;* **to fall on *one's* ~** arxası üstə/dalı üstə yıxılmaq; **to be on *one's* ~** yataqda *(xəstə)* olmaq; **to stab in the ~** 1) kürəyinə bıçaq soxmaq, arxadan bıçaq vurmaq; 2) *məc.* satmaq, ələ vermək; **to pat on the ~** 1) kürəyinə vurmaq *(razılıq əlaməti olaraq)*; 2) bir kəsə dayaq durmaq, bir kəsi müdafiə etmək; *He has a strong back* 1) *Onun enli kürəyi var;* 2) *məc. O hər şeyə dözə bilər, Onu sındırmaq olmaz;* 2. bel sütunu; onurğa, bel sümüyü; *He has broken his back O, bel sütununu/onurğasını sındırıb;* 3. bel; **a sharp pain in the ~** beldə kəskin ağrı; 4. bir şeyin arxa/ dal tərəfi; *The back of the knife won't cut Bıçağın dal tərəfi kəsmir;* **the ~ of the house** evin dal tərəfi; *The back of the house looks out into the river Evin dal tərəfi çaya baxır;* **the ~ of the hand** əlin arxa tərəfi; 5. dal, söykənəcək; **the ~ of the chair/sofa** stulun/divanın söykənəcəyi; **at the ~** arxada, dalda; **a garden at the ~ of the house** evin arxasındakı/dalındakı bağ; 6. astarı, astar üzü, tərs üzü; **the ~ of the cloth/rug** parçanın / gəbənin tərs üzü; 7. müdafiəçi *(futbolda)*; *John is one of the backs Con müdafiəçilərdən biridir;*

◊ **~ to ~** arxa-arxaya, kürək-kürəyə; **to stand behind *smb.'s* ~, to be at the ~ of *smb.*** bir kəsin arxasında durmaq/dayanmaq; **to turn *one's* ~ on** darda qoymaq, kömək etməmək; **to put *one's* ~ into *one's* work** həvəslə/ciddiyyətlə işləmək; **to bow *one's* ~** boyun əymək; yaltaqlanmaq, ikiqat əyilmək; *Scratch my back and I'll scratch yours ≅ Əl əli yuyar, əl də üzü*

**back**[2] [bæk] *adj* 1. arxa, dal, daldakı, geridəki; **the ~ door** arxa qapı; **~ rows** arxa sıralar; **~ entrance** dal /arxa giriş; **~ tooth** dal/arxa diş; **~ vowel** *fon.* arxa sıra saiti; 2. uzaq; **~ settlement** uzaq yaşayış məntəqəsi; 3. əks, tərs; **~ current** əks axın; 4. köhnə; **a ~ number of a magazine** jurnalın köhnə nömrəsi;

◊ **~ alley** mərkəzdən uzaq olan xarabalıq; **~ seat driver** *amer. maşında oturub sürücüyə maşını necə sürmək haqqında göstəriş verən sərnişin*

**back**[3] [bæk] *v* 1. müdafiə etmək; tərəfini saxlamaq; tərəfdar çıxmaq, bəyənmək; **to ~ a plan** planı müdafiə etmək, plana tərəfdar çıxmaq; **to ~ *smb.*** bir kəsə tərəfdar çıxmaq, bir kəsi müdafiə etmək; *The union leaders decided to back the Government Həmkarlar təşkilatının rəhbərləri dövləti müdafiə etmək qərarına gəldilər; I ask you to back my plan Səndən / Sizdən xahiş edirəm mənim planımı müdafiə edəsən/edəsiniz;* 2. əks tərəfə hərəkət etdirmək, geri vermək *(maşını və s.)*; **to ~ a car** maşını geri vermək; **to ~ the troops into position** qoşunu əvvəlki mövqeyinə qaytarmaq; *He backed a step to let the old woman pass O, bir addım geri durdu ki, qoca qadın keçsin;* **to ~ away, to ~ down** geri çəkilmək, çəkilmək; əl çəkmək/götürmək; **to ~ on** ümid etmək, arxayın/əmin olmaq; bel bağlamaq, etibar etmək; *I backed on his ability Mən onun bacarığına ümid etdim/arxayın oldum/bel bağladım;* **to ~ out (of)** boyun qaçırmaq, geri durmaq; **to ~ out of a promise** vədə əməl etməmək

**back**[4] [bæk] *adv* 1. geri, geriyə, dala; **to take ~** geri almaq; **to send ~** geri göndərmək; **to bring ~** geri gətirmək; **to come ~** geri/dala qayıtmaq; **to look ~** dala/geri baxmaq, geri boylanmaq; **to pay ~** borcu geri qaytarmaq; **to answer ~** söz qaytarmaq, etiraz etmək; 2. öncə, əvvəl; **an hour ~** bir saat öncə/əvvəl; **a few years ~** bir neçə il öncə/əvvəl; *If you go a few years back, you will remember everything Əgər sən/siz bir neçə il əvvələ dönsən/ dönsəniz, hər şeyi xatırlayacaqsan/xatırlayacaqsınız;* 3. arxaya, arxada, arxadan; **to tie *one's* hair ~** saçını arxadan bağlamaq; **to stand ~** arxada durmaq; *He stood back in the crowd O, camaatın arxasında dururdu;* 4. yenidən; *The liquid turned back into gas Maye yenidən qaza çevrildi*

**backache** ['bækeık] *n* kürək/bel ağrısı; *I am suffering from a backache Mən bel ağrısından əziyyət çəkirəm*

**back-answer** ['bæk.a:nsəʳ] *n* çəmkirmə, kobudcasına sözqaytarma

**backbite**[1] ['bækbaıt] *n* dalınca danışma, qeybət etmə; qeybət, dedi-qodu; böhtan

**backbite**[2] ['bækbaıt] *v (pt* **backbit**; *pp* **backbitten**) dalınca danışmaq, qeybət etmək, yamanlamaq

**backbiting** ['bækbaıtıŋ] *n* = **backbite**[1]

**backbitten** ['bæk.bıtn] to **backbite** *felinin k. z. feli sifət forması*



**backblow** ['bækblou] *n* 1. arxadan zərbə; 2. *məc.* gözlənilməz / qəfil zərbə; **~s of fortune** fələyin gözlənilməz zərbələri

**backbone** ['bækboun] *n* 1. əsas, mahiyyət; **the ~ of the theory** nəzəriyyənin əsası / mahiyyəti; 2. dayaq; dirək; **the ~ of the feodal system** feodal quruluşunun dayağı; 3. iradə; xarakterin möhkəmliyi; **to lack ~** iradəsiz olmaq; 4. kötük *(kitabda, dəftərdə və s.)*; **the ~ of the book** kitabın kötüyü; 5. *anat.* onurğa sütunu/sümüyü;

◊ **to the ~** iliyinə kimi; *He is a patriot to his very backbone O, iliyinə kimi vətənpərvərdir; The cold is searching my backbone Soyuq mənim iliyimə işləyir*

**backboned** ['bækbound] *adj* 1. qətiyyətli; möhkəm; 2. *zool.* onurğalı; **~ animals** onurğalı heyvanlar

**backbreaking** ['bækbreıkıŋ] *adj* çox ağır, belsındıran, əldən salan, həddən artıq zəhmət tələbedən; dözülməz, məşəqqətli; **~ job** çox ağır /dözülməz/həddən artıq çətin iş; **~ load** çox ağır /belsındıran yük

**backbreakingly** ['bækbreıkıŋlı] *adv* çox ağır, dözülməz / güccatmaz dərəcədə; **~ difficult** çox ağır / dözülməz dərəcədə çətin

**backchat** ['bæktʃət] *n* çəmkirmə, sözqaytarma; *Now listen to me carefully, and I don't want any backchat Diqqətlə qulaq as mənə, çəmkirmək/söz qaytarmaq lazım deyil*

**back-comb** ['bækkoum] *n* saçı əks istiqamətdə darama

**back-country** ['bæk.kʌntrı] *n* az əhalisi olan / mərkəzdən uzaq / tənha yer

**back-countryman** ['bæk.kʌntrımən] *n (pl* **-men** [-mən]) uzaq kənddə yaşayan, əyalət adamı; avam adam

**back-court** ['bækkɔ:t] *n* 1. *id.* müdafiə zonası; 2. *k.t.* quş və ya heyvan üçün həyət

**backdate** [.bæk'deıt] *v* köhnə / əvvəlki tarixlə həyata keçirmək *(bir şeyi)*; *The pay increase agreed in June will be backdated to January İyun ayında məvacibin artırılması haqqında razılaşma yanvar ayından həyata keçiriləcək*

**back door** ['bæk'dɔ:ʳ] *n* 1. dal qapı; tanışlıqla, qanunsuz yol ilə; *He got in by the backdoor O, içəri tanışlıqla girdi*

**backdown**[1] ['bækdaun] *n* geri çəkilmə, uzaqlaşma; mövqedən çəkinmə; təslim olma

**backdown**[2] [.bækdaun] *v* geri çəkilmək, təslim olmaq; *The speaker's forceful words persuaded his opponent to back down Natiqin təsirli sözləri onun opponentini geri çəkilməyə vadar etdi*

**backfall** ['bækfɔ:l] *n* arxası üstə yıxılma

**backgammon** ['bækgæmən] *n* nərd; nərd oyunu; **to play ~** nərd oynamaq

**background** ['bækgraund] *n* 1. arxa plan, fon; *The house stood out against the background of the forest Ev meşənin fonunda dayanmışdı;* **to melt into the ~** fona qarışmaq; **to stay in the ~** arxa planda qalmaq; 2. *kino.* şərait, hərəkət məkanı / yeri, ikinci dərəcəli hərəkət; 3. əsl səbəb; gizli səbəb, işin iç üzü; *The background of the deal was easy to explain Sazişin əsl səbəbini izah etmək asan idi; Give me the background of the problem Problemin əsas səbəbini mənə de/deyin;* 4. hazırlıq, səriştə, təcrübə; *He has the right background for the job Onun işə lazımi hazırlığı var;* 5. əsil, mənşə; tərcümeyi-hal haqqında məlumatlar; **a young man of excellent ~** əla mənşəyə malik gənc *(adam)*

**back-hair** ['bæk'heəʳ] *n* uzun qadın saçı

**backhand** ['bækhænd] *n* bəkhənd, soldan zərbə *(tennisdə)*; əlin arxa tərəfi ilə vurulan zərbə *(voleybolda və s.)*; *He won the game because of his strong backhand O, oyunu sol əli ilə vurduğu qüvvətli zərbələr sayəsində uddu*

**backhanded** ['bæk'hændıd] *adj* 1. əlin arxa tərəfilə vurulmuş *(zərbə haq.)*; *He struck the man a backhanded blow O, kişiyə əlinin dal tərəfi ilə zərbə endirdi;* 2. ikimənalı; şübhəli; **~ compliment** şübhəli/ikimənalı kompliment; 3. bilvasitə; **~ reminder** bilvasitə xatırlama/yadasalma; eyham; 4. sola meyllənmiş *(əlyazması haq.)*

**backhandedness** ['bæk'hændıdnıs] *n* 1. kütlük, bacarıqsızlıq; ağırlıq, lənglik *(işdə)*; 2. səliqəsizlik; 3. şübhəli /ikimənalı kompliment; 4. bilvasitə irad; incə eyham

**backlog** ['bæklɔg] *n* geriqalma; **~ of work** işdə geriqalma; **to catch up with the ~** geriqalmanı aradan qaldırmaq

**backmost** ['bækmoust] *adj* ən/lap arxa; **the ~ row of seats** cərgələrin ən arxa yerləri

**back-room**[1] ['bækru:m] *n* 1. arxa otaq *(barda və s.)*; 2. gizli fəaliyyət göstərilən yer *(xüs. siyasi)*; 3. gizli laboratoriya, gizli elmi-tədqiqat müəssisəsi

**back-room**[2] ['bækru:m] *adj* 1. gizli, xəlvəti; **~ compromise** gizli kompromis; 2. gizli, hərbi mənası olan; məxfiləşdirilmiş; **~ boys** yeni silah növü üzərində işləyən alim və konstruktorlar; gizli laboratoriya əməkdaşları

**back seat** [.bæk'si:t] *n* maşının arxa oturacağı

**backstroke** ['bækstrouk] *n id.* arxası üstə üzmə

**back-talk** ['bæktɔ:k] *n* söz qaytarma, çəmkirmə; **to give ~** mırıldamaq, çəmkirmək

**backtrack**[1] ['bæktræk] *n hərb.* geri çəkilmə

**backtrack**[2] ['bæktræk] *v* 1. geri çəkilmək; imtina etmək; *The government is already backtracking from its promise Hökumət artıq öz vədindən imtina edir;* 2. geri qayıtmaq, geri dönmək

**back-up** ['bæk'ʌp] *n* 1. eyni rolu ifa etmə; *(kosmonavtikada)*; 2. kosmonavt-dublyor

**backward**[1] ['bækwəd] *adj* 1. dala, geriyə; **a ~ look** dala/geriyə baxış, dala boylanma; *On seeing me she made a backward movement Məni görərkən o geriyə çəkildi / dala döndü;* 2. geri-

də qalmış, dala qalmış, inkişaf etməmiş; ~ **child** geri qalmış/inkişaf etməmiş uşaq; ~ **country** inkişaf etməmiş ölkə; *Some backward parts of the country do not have electricity Ölkənin bəzi geri qalmış hissələrində elektrik yoxdur;* 3. gecikmiş; yubanmış, ləngimiş ~ **spring /autumn** gecikmiş yaz / payız; 4. həvəssiz, ürəksiz; cəsarətsiz

**backward²** ['bækwəd] *adv* 1. geri; **to step** ~ bir addım geri durmaq; *He stepped backward O, bir addım geri durdu;* **to look** ~ geri baxmaq; *He looked backward O geri baxdı;* **to turn** *one's* **head** ~ başını çevirmək, çevrilib baxmaq, dönüb dala baxmaq; **to fall** ~ dalı üstə / arxası üstə yıxılmaq; **to cast** ~ **a light** işığı əks etdirmək; **to turn** ~ **from his beliefs** öz inamından geri dönmək/əl çəkmək/imtina etmək; 2. əks istiqamətə; **to go** ~ **and forward** irəli geri getmək, vargəl etmək; 3. əksinə, əks istiqamətdə; **to walk** ~ daldalı getmək; **to say the alphabet** ~ əlifbanı əksinə / əks istiqamətdə demək; **to read** ~ sondan əvvələ/tərsinə oxumaq;

◊ **to lean over** ~ 1) geriyə/dala əyilmək; 2) dərindən - qabıqdan çıxmaq

**backwardness** ['bækwədnıs] *n* gerilik

**backwards** [bækwədz] *adv* = **backward²**

**backwater** ['bæk.wɔ:təʳ] *n* kiçik körfəz *(çayda, göldə)*, nohur; 2. axının əksinə

**backway** ['bækweı] *n* 1. dal qapı; 2. dolayı yol; *There is no backway Dolayı/Geriyə yol yoxdur*

**backwoods¹** ['bækwudz] *n pl.* meşədə tənha yer, meşədə xəlvəti yer

**backwoods²** ['bækwudz] *adj* 1. meşədə tənha yerdə yaşayan; 2. rəndələnməmiş, mədəniyyətcə geridə qalmış; avam, cahil

**backwoodsman** ['bækwudzmən] *n (pl* **-men** [mən]) 1. meşədə tənha yerdə yaşayan adam; 2. *zaraf.* vəhşi, ayı; 3. lordlar palatasının kənddə yaşayan və palatanın iclaslarında az-az iştirak edən üzvü

**back-yard** ['bæk'ja:d] *n* 1. evin arxasında olan məhlə və ya bağça; 2. həyətyanı sahə, evə yapışıq təsərrüfat yeri

**backyard** ['bækja:d] *adj* yerli; xüsusi; ~ **production** yerli istehsal

**backyarder** ['bæk.ja:dəʳ] *n* kiçik istehsalçı *(həyətyanı sahədə toyuq, krolik və s. saxlayan)*

**bacon** ['beıkən] *n* 1. bekon *(donuzun hisə verilmiş, duzlanmış döş və ya bud əti)*; **a gammon of** ~ vetçina *(qaxac edilmiş donuz əti/donuz budu)*; ~ **and eggs** donuzun hisə verilmiş döş əti ilə bişirilmiş qayğanaq; 2. *d.d.* mükafat; gəlir; uduş; **to bring home the** ~ 1) nailiyyət / müvəffəqiyyət qazanmaq; 2) kifayət qədər qazanmaq;

◊ **to save** *one's* ~ *(öz)* canını qurtarmaq; *I saved my bacon by arriving just in time for the meeting Mən iclasa düz vaxtında gəlməklə canımı qurtardım*

**bacony** ['beıkənı] *adj* piyli, piybasmış; ~ **liver** *tib.* piybasmış ciyər

**bacteria** [bæk'tıərıə] *n* **bacterium** *isminin cəm forması*

**bacterial** [bæk'tıərıəl] *adj* bakterial; ~ **action** mikrobların fəaliyyəti; ~ **cultivation** bakteriya yetişdirmə/əkmə; ~ **equilibrium of soil** *k.t.* torpağın bakrerial balansı

**bacteriological** [bæk.tıərıə'lɔdʒıkəl] *adj* bakterioloji; ~ **warfare** bakterioloji müharibə; ~ **weapons** bakterioloji silah

**bacteriologist** [bæk.tıərı'ɔlədʒıst] *n* bakterioloq *(bakteriologiya alimi)*

**bacteriology** [bæk.tıərı'ɔlədʒı] *n* bakteriologiya *(bakteriyalardan bəhs edən elm)*, mikrobiologiya

**bacterium** [bæk'tıərıəm] *n (pl* **-ria**) mikrob, bakteriya

**bactrian** ['bæktrıən] *n zool.* ikihürgüclü dəvə

**bad** [bæd] *adj (müq. dərəcəsi:* **worse** [wə:s]; *üst. dərəcəsi:* **worst** [wə:st]) 1. pis, yaman, iyrənc, yaramaz, çirkin, ağır; ~ **work** pis iş, **a** ~ **worker** pis işçi; ~ **action** pis/yaramaz/çirkin hərəkət; ~ **handwriting** pis xətt; ~ **food** pis/iyrənc yemək; ~ **novel** pis roman; ~ **reputation** pis /yaman ad; ~ **habit** pis/çirkin/iyrənc vərdiş; ~ **luck** uğursuzluq; ~ **news** pis/ağır xəbər; ~ **taste** pis/iyrənc dad; **to be in a** ~ **temper** ovqatı pis olmaq, kefsiz olmaq; 2. əxlaqsız, pozğun, ədəbsiz; **a** ~ **woman** əxlaqsız / pozğun qadın; ~ **words** ədəbsiz sözlər; ~ **language** hədyan, nalayiq sözlər, söyüş; 3. iyimiş, iylənmiş, qoxumuş; çürük; yararsız; ~ **fish** iyimiş/qoxumuş balıq; ~ **water** yararsız/pis su *(içməyə yaramayan)*; ~ **tooth** çürük diş; 4. qeyri-səmimi; şərəfsiz, namussuz; **a** ~ **man** qeyri-səmimi/ikiüzlü/şərəfsiz adam; 5. iyrənc, çirkin, xoşagəlməz; **a** ~ **smell** xoşagəlməz/ iyrənc iy; **a** ~ **taste** xoşagəlməz/iyrənc dad; 6. əlverişsiz, yaramayan; münasib olmayan; ziyan; ~ **food for the young** uşaqlar üçün yaramayan qida; *The weather is bad for tennis Hava tennis üçün münasib deyil; Smoking is bad for you Siqaret çəkmək sənə/sizə ziyandır;* 7. saxta, qəlp; süni; qondarma, qüvvəsini itirmiş; qanuni qüvvəsi olmayan *(sənəd və s.)*; ~ **coin** qəlp sikkə/dəmir pul; ~ **passport** saxta pasport; 8. uğursuz, baş tutmayan; ~ **try** uğursuz cəhd/səy; 9. səhv, yalan, düzgün olmayan; qeyri-dəqiq; ~ **spelling** 1) səhv yazı; ~ **grammar** qrammatik səhv/xəta; 2) qrammatik baxımdan səhv nitq; 10. **(at)** bacarıqsız, zəif, qabiliyyətsiz; ~ **at figures** hesabdan zəif; **to be** ~ **at tennis** tennisi zəif oynamaq; 11. bərk; kəskin; böyük; ağır; **a** ~ **cold** bərk soyuqdəymə; ~ **pain** kəskin ağrı; ~ **bruise** böyük qançır *(zərbədən)*; ~ **mistake** böyük səhv; ~ **crime** ağır cinayət; *He had a bad fall O yıxıldı və ağır zədə aldı;* **to have a** ~ **temperature** yüksək istiliyi olmaq; 12. kinli, qəzəbli; hirsli, acıqlı; **to**



**give** *smb.* **a** ~ **look** bir kəsə acıqlı / hirsli / qəzəbli baxmaq;

◊ ~ **disease** pis xəstəlik *(sifilis)*; ~ **case** ağır xəstəlik; ~ **blood** düşmənçilik; qovğa, dalaşma; **to make** ~ **blood between persons** insanlar arasında düşmənçilik / qovğa salmaq; **to keep** ~ **hours** qeyri-normal həyat sürmək; gec yatıb, gec durmaq; *Too bad! Çox əfsus!* **to be in a** ~ **way** pis yolda olmaq *(fiziki, əxlaqi baxımdan)*; **from** ~ **to worse** getdikcə pisləşmə; **to exchange the** ~ **for better** işləri qaydaya salmaq/yaxşılaşdırmaq; *Bad is the best Qarşıda yaxşı heç nə görünmür;* **to be in** *smb.'s* ~ **books** bir kəsin qara siyahısında olmaq

**badge¹** [bædʒ] *n* 1. nişan; emblem, rəmz; *The delegates exchanged badges Nümayəndələr bir-birinə nişan verdilər;* 2. *hərb.* fərqləndirmə nişanı; ~ **of rank** rütbəni bildirən fərqləndirmə nişanı; 3. əlamət, işarə; *Chains are the badge of slavery Zəncir quldarlıq əlamətidir; Courtesy is the badge of a gentleman Nəzakət tərbiyəli adamın əlamətidir.*

**badge²** [bædʒ] *v* nişanla işarə etmək

**badged** ['bædʒd] *adj* damğalanmış, damğa vurulmuş, işarə edilmiş, nişanlanmış

**badgeless** ['bædʒlıs] *adj* işarəsiz, nişansız; fərqləndirici əlaməti olmayan; *The cargo was badgeless Yük işarəsiz idi (yəni üstündə birka yox idi)*

**badger¹** ['bædʒəʳ] *n* 1. *zool.* porsuq; 2. porsuq mexi; 3. porsuq qılından hazırlanmış fırça *(rəsm çəkmək üçün)*

**badger²** ['bædʒəʳ] *v* cırnatmaq; yapışmaq, dalınca düşmək, əl çəkməmək; təngə gətirmək; qəmiş olmaq; *You are always badgering me Sən/Siz mənə həmişə qəmiş olursan / olursunuz*

**badginage** ['bædʒına:ʒ] *n fr.* zarafat; lağlağı, laqqırtı; *Enough this badginage, let's talk seriously Laqqırtı yetər, gəl/gəlin ciddi danışaq*

**badlands** ['bædlændz] *n* 1. *k.t.* münbit olmayan/məhsul verməyən torpaq; 2. *geol.* güclü surətdə aşınmaya məruz qalan yer

**badly** ['bædlı] *adv müqayisə dərəcəsi:* **worse**; *üst. dərəcəsi:* **worst** 1. pis, xarab; ~ **made clothes** pis tikilmiş paltar; **to play** ~ pis oynamaq; *He is doing badly Onun işləri xarabdır / pisdir;* 2. ağır, ciddi; bərk; ~ **wounded** ağır / ciddi/bərk yaralanmış; **to be** ~ **ill** ağır / ciddi xəstə olmaq; *They want help badly Onların köməyə ciddi ehtiyacı var; My horse was badly beaten in the race Mənim atım yarışda ağır məğlubiyyətə düçar oldu;*

◊ **to be** ~**off** ehtiyacı olmaq, çətin vəziyyətdə olmaq; çətin vəziyyətə düşmək; *He is badly-off for friends Onun dosta ehtiyacı var; He is not so badly-off O, çox da pis yaşamır, O, çox da pis vəziyyətdə deyil*

**badminton¹** ['bædmıntn] *n* badminton

**badminton²** ['bædmıntn] *adj* badminton; ~ **bird** badminton oynamaq üçün valan *(ucuna lələk taxılmış kiçik ağac və ya probkadan ibarət oyun aləti)*

**badness** ['bædnıs] *n* pislik, yaramazlıq; **the** ~ **of the weather/climate** havanın/iqlimin pisliyi

**baffle¹** ['bæfl] *n* 1. uğursuzluq, müvəffəqiyyətsizlik; ümidsizlik, məyus olma, ümidi kəsilmə; 2. maneə, əngəl, çətinlik; 3. *tex.* səsboğan, səsudan *(cihaz)*

**baffle²** ['bæfl] *v* 1. çaşdırmaq, karıxdırmaq, çətinliyə salmaq; yolundan döndərmək/ azdırmaq; *The last examination question baffled me completely Axırıncı imtahan sualı məni tamam çaşdırdı;* 2. mane olmaq; pozmaq, alt-üst etmək; dağıtmaq, pəl vurmaq; **to** ~ **the enemy's plan** düşmənin planını pozmaq/alt-üst etmək;

◊ **to** ~ **description** təsviri qeyri-mümkün etmək

**baffled** ['bæfld] *adj* 1. çaşdırılmış, çətinliyə salınmış; 2. heyrətə salan, heyrət doğuran, ağla sığmayan, anlaşılmaz; ~ **question** ağla sığmayan/anlaşılmaz məsələ/ sual

**baffling** ['bæflıŋ] *adj* 1. çətin, zor, müşkül; zəhmətli, əziyyətli; ~ **problem** çətin / müşkül problem; 2. qarşı; arzu edilməyən /olunmayan; ~ **wind** qarşıdan əsən külək; 3. anlaşılmaz, dərkedilməz, ağlasığmaz; sirli, müəmmalı, qəribə; ~ **person** anlaşılmaz / müəmmalı şəxs

**baft** [ba:ft] *n* bafta *(parça növü)*

**bag¹** [bæg] *n* 1. kisə, torba; **paper** ~ kağız torba/kisə; 2. sumka, portfel, çanta; **shopping** ~ bazar sumkası; **evening** ~ axşam sumkası *(teatra gedərkən ələ götürülən)*; 3. çamadan; **gladstone** ~ dəri çamadan; 4. ovçunun əldə etdiyi qənimət *(ov)*;

◊ ~ **and baggage** 1) əlli-ayaqlı; hər şeyi ilə birlikdə; *They threw her out of the house bag and baggage Onlar onu şey-şüyü ilə birlikdə evdən bayıra atdılar;* 2) bütünlüklə, tamamilə, başdan-başa; **a** ~ **of bones** bir dəri, bir sümük *(çox arıq adam və ya heyvan)*; **a** ~ **of wind** boşboğaz, gəvəzə, lovğa, gopçu, özünü öyən; **to leave** *smb.* **holding the** ~ bir kəsi fəlakətdə / müsibətdə qoyub qaçmaq; məsuliyyəti bir kəsin boynuna qoymaq; **to let the cat out of the** ~ ≅ ağzından qaçırmaq, sirr vermək, ağzıyırtıqlıq etmək; ~**s of time** həddən çox vaxt; *We have bags of time Bizim həddən çox vaxtımız var;* ~**s under the eyes** gözlərin altında şiş/torba; **diplomatic** ~ diplomatik poçt

**bag²** [bæg] *v* (**-gg-**) 1. kisəyə/torbaya qoymaq; 2. şarı luzaya salmaq *(bilyard oyununda)*; *He bagged the ball nicely O, şarı məharətlə luzaya saldı;* 3. ovlanmış quşu ovçu çantasına qoymaq; 4. vurmaq *(çox miqdarda heyvan, quş)*; *He bagged a hare O, bir dovşan vurdu;* 5. *d.d.* yığmaq, toplamaq; **to** ~ **subscription** imza toplamaq; **to** ~ **butterflies** kəpənək toplamaq/yığ-

maq *(kolleksiya düzəltmək üçün)*; 6. qabarmaq, şişmək; torbalanmaq; *His trousers bagged (out) at the knees Onun şalvarı dizlərindən torbalanıb;* 7. *d.d.* işdən azad etmək/qovmaq; 8. oraqla biçmək; 9. icazəsiz götürmək; *He bagged my pencil O mənim karandaşımı (icazəsiz) götürdü*

**bagful** ['bægful] *n* 1. kisə/torba dolusu, bir torba/kisə; 2. *məc.* çoxlu, hədsiz, hədsiz-hesabsız, saysız-hesabsız; **a ~ of money** çoxlu / saysız-hesabsız pul

**baggage** ['bægɪdʒ] *n* 1. *amer.* baqaj, yük; *The porter carried his baggage Hambal onun baqajını apardı;* 2. *kob.* gəzəyən qadın, fahişə, əxlaqsız qadın; 3. kifir/zəhlətökən qoca arvad

**baggage-car** ['bægɪdʒ'ka:ʳ] *n amer.* yük vaqonu

**baggage-check** ['bægɪdʒ'tʃek] *n amer.* baqaj qəbzi

**baggage-man** ['bægɪdʒmæn] *n (pl* **-men** [-men]) = **baggage-master**

**baggage-master** ['bægɪdʒ.ma:stəʳ] *n amer.* hambal, yükdaşıyan

**baggage-room** ['bægɪdʒ'ru:m] *n amer.* yüksaxlama kamerası

**baggy** ['bægɪ] *adj* 1. torbayaoxşar, kisəyəoxşar, torba kimi; **~ skin under *one's* eyes** gözün altında torbayaoxşar dəri; **~ cheeks** bürüşük yanaq; **~ trousers** torbayaoxşar şalvar *(ütülənməməyin və ya çox geyinilməyin nəticəsində)*; 2. təmtəraqlı, dəbdəbəli; ibarəli *(nitq haq.)*

**bagpipes** ['bægpaɪps] *n* tuluq zurnası; **to play the ~** tuluq zurnası çalmaq

**bags** [bægz] *n* I çox/həddən artıq miqdar; **to have ~ of money** çox / həddən ziyadə pulu olmaq; *He has bags of money Onun çox / həddən artıq pulu var*

**bags** [bægz] *n* II kişilər üçün enli şalvar

**bah** [ba:] *int. (etiraz və laqeydlik ifadə edir) Cəfəngiyyat!, Daha nə!*

**bail[1]** [beɪl] *n* I *hüq.* 1. girov; zəmanət, zaminlik; **to stand ~ for *smb.*** bir kəsə zamin durmaq; **to let to ~** zəmanətlə həbsdən azad etmək; **to accept / to take ~ for the prisoner** dustağı zaminə götürmək; **to save *one's* ~, to surrender to *one's* ~** vaxtında məhkəməyə gəlmək *(zaminə buraxılan haq.)*; 2. zamin, zəmanətçi, zamin olan; **to be /to go ~** zamin olmaq; **to find ~** özünə zəmanətçi tapmaq; 3. dustağı müvəqqəti olaraq zaminə buraxma; *He is out on short bail Onu müvəqqəti olaraq zaminə buraxıblar;* 4. *d.d.* cavabdeh olma; *I'll go bail for that Mən buna cavabdeh olacam*

**bail** [beɪl] *n* II vedrə; parç, tayqulp, çömçə, abgərdən

**bail[2]** [beɪl] *v* **(out)** I. zaminə götürmək *(müəyyən məbləğ pul ödəməklə); Clark was charged with robbing the bank, so his family paid $ 50000 to bail him out Klark bankı yarmaqda ittiham olunurdu, ona görə ailəsi 50000 $ ödəyərək onu zaminə götürdü*

**bail** [beɪl] *v* II suyu qayıqdan vedrə ilə götürmək /çıxartmaq

**bailey** ['beɪlɪ] *n tar.* qəsrin divarı, qəsrin həyəti; **inner /outer ~** xarici /daxili həyət

**bailiff** ['beɪlɪf] *n* 1. *hüq.* məhkəmə pristavı / icraçısı; 2. *amer.* şerif köməkçisi;
◊ **~'s follower** xəfiyyə; casus

**bait[1]** [beɪt] *n* 1. tələ yemi; yem; *Worms are good bait for fish Soxulcanlar balıqlar üçün yaxşı tələ yemidir;* 2. yoldan çıxarma, şirnikdirici şey; nəfs, tamah; *He fell for the bait immediately O dərhal tamahlandı;* **to jump at the ~, to rise to the ~, to swallow the ~** qarmağa/tələyə/tora düşmək, aldanmaq; 3. siçovullar/həşəratlar üçün zəhər, gəmiriciləri məhv etmək üçün vasitə; 4. yola götürülən yemək; 5. yem *(at üçün)*; 6. düşərgə, düşərgə salma; 7. qıs vurma *(itləri)*

**bait[2]** [beɪt] *v* 1. qısqırtmaq, qıs vurmaq; **to ~ *smb.* with dogs** itləri bir kəsin üstünə qısqırtmaq; 2. rahatlıq verməmək, incitmək, cana/təngə gətirmək, sakitlik verməmək; 3. tələ yemi ilə tutmaq/tora salmaq; qarmaqla tutmaq; *The mouse was baited with cheese Siçanı pendirlə tələyə saldılar;* 4. tamahlandırmaq, şirnikləndirmək, aldatmaq; **to ~ *smb.* with promises** bir kəsi vədlərlə tovlamaq/aldatmaq/şirnikləndirmək; **to ~ the hook** tor/tələ qurmaq *(bir kəsə)*; 5. atı yemləmək *(yolda)*; 6. dayanmaq, müvəqqəti yaşamaq *(bir yerdə)*

**baited** ['beɪtɪd] *adj* 1. təqib olunan/ edilən; 2. yem qoyulmuş *(tələ haq.)*, yem keçirilmiş *(tilov, qarmaq haq.)*; **the ~ hook** yem keçirilmiş qarmaq

**baize** [beɪz] *n toxuc.* 1. bayka *(xovlu yumşaq yun və ya pambıq parça)*; 2. bobrik *(xovlu mahud növü)*; 3. baykadan tikilmiş pərdə/süfrə və s.

**bake[1]** [beɪk] *n* bişirmə, bişirilmə

**bake[2]** [beɪk] *v* 1. bişirmək; **to ~ bread** çörək bişirmək; **to ~ a pie** piroq bişirmək; 2. bişmək; bişirilmək; *The bread is baking Çörək bişir; In former times bricks were baked in the sun until they became hard Keçmiş zamanlarda kərpic bərkiyənə qədər günəş altında bişirilirdi; Open the window, I'm baking in here Pəncərəni aç/açın, mən burada bişirəm;* 3. qurutmaq, qurumaq; *His lips were baked with heat Onun dodaqları istidən qurumuşdu;* 4. bişmək, yanmaq *(günəş altında)*; özünü günəşə vermək; *We are baking in the sun Biz günəşdən bişirik*

**baked** [beɪkt] *adj* 1. bişmiş; bişirilmiş; **~ apple** bişmiş / bişirilmiş alma; **~ potatoes** bişmiş / bişirilmiş kartof; 2. qurumuş; **lips ~d with heat** istidən qurumuş dodaqlar;

**bake-house** ['beɪkhaus] *n* çörəkxana, çörək bişirilən yer

**baker** ['beɪkəʳ] *n* çörəkçi, şatır, çörəkbişirən; **the ~'s (shop)** çörəkxana, çörək dükanı;
◊ **~' dozen** on üç; *I asked him for 12, but he gave me a baker's dozen Mən ondan 12-sini xahiş etdim, lakin o mənə 13-ünü verdi*



**baker-legged** ['beɪkə'legd] *n* əyriayaq, ayaqları əyri

**bakery** ['beɪkərɪ] *n* çörək bişirilən və ya satılan yer, çörəkxana, çörəkçixana; bulka dükanı

**baking-powder** ['beɪkɪŋ.paudəʳ] *n* çörəkbişirmə işində istifadə edilən soda

**baksheesh** ['bækʃi:ʃ] *n* çaypulu, bəxşiş; rüşvət

**bakshish** ['bæʃi:ʃ] *n* = **baksheesh**

**balalaika** [.bælə'laɪkə] *n* balalayka *(simli rus musiqi aləti)*

**balance[1]** ['bæləns] *n* 1. tərəzi; **quick/Roman ~** yaylı əl tərəzisi, yaylı tərəzi; 2. tərəzinin gözləri; **a pair of ~** tərəzinin gözü/qapağı; **to tip the ~** tərəzinin gözünü əymək; *məc.* üstünlük vermək; 3. müvazinət; müvazinət vəziyyəti; **stable ~** sabit/sarsılmaz/möhkəm/davamlı müvazinət; **~ of power** qüvvələrin müvazinəti; **to maintain a strict ~ of forces** qüvvələrin müvazinətini saxlamaq; **to hold the ~ even** müvazinəti düz saxlamaq; **to keep /to hold/to preserve *one's* ~** müvazinətini saxlamaq/mühafizə etmək; *The unexpected blow threw him off his balance Gözlənilməz zərbə onu müvazinətdən çıxardı;* **to make out the ~** müvazinəti tarazlıq vəziyyətinə salmaq; 4. ruhi müvazinət, sakitlik, müvazinət; **to be off *one's* ~** müvazinətini /daxili sakitliyini itirmək; **to lose *one's* ~** özündən çıxmaq, müvazinətini itirmək; *His character shows a perfect balance of mind and body Onun xarakteri göstərir ki, o həm mənəvi, həm də cismani cəhətdən kamil müvazinətə malikdir; He kept his balance even at the most trying moments O, hətta ən ağır anlarda belə müvazinətini saxladı;* 5. həmahənglik, mütənasiblik, proporsionallıq; **the ~ of colours** rənglərin həmahəngliyi; 6. kəfkir, rəqqas *(saatda)*; **a clock with a ~** kəfkirli saat; 7. *mal.* balans; qalıq; saldo *(gəlir və çıxar yekunları arasındakı fərq - debet və kredit)*; **~ of payments** ödəmə balansı; **trade ~, ~ of trade** ticarət balansı; **favourable /unfavourable ~** aktiv/passiv balans; **~ of an account** hesabın qalığı; **to strike the ~** balansa yekun vurmaq, balansı yekunlaşdırmaq; yekun vurmaq; **to bring accounts to a ~** hesabın ümumi balansını hazırlamaq;
◊ **upon/on a ~** vəziyyəti ölçüb-biçərək, hər şeyi nəzərə alaraq; *I think on a balance, I prefer the new-system Vəziyyəti nəzərə alaraq mən yeni quruluşu üstün tuturam;* **to be in the ~** qeyri-müəyyən vəziyyətdə olmaq; *The future is in the balance Gələcək qeyri-müəyyəndir/aydın deyil;* **to swing / to tremble in the ~** 1) tükdən asılı olmaq; çətin vəziyyətdə olmaq; 2) tərəddüd etmək, şübhələnmək; **to weigh in the ~** müzakirə etmək, götür-qoy etmək; qiymətləndirmək *(dəlili, sübutu, ləyaqəti və s.)*

**balance[2]** ['bæləns] *v* 1. müvazinət saxlamaq; taraz olmaq; tarazlamaq; *Do these scales balance? Bu tərəzi tarazdırmı?;* 2. tarazlaşdırmaq; taraz vəziyyətə gətirmək; bərabərləşdirmək, müvazinətləşdirmək; nizama salmaq, qaydaya salmaq; **to ~ foreign trade** *siya. iq.* xarici ticarəti tarazlaşdırmaq; *The teams were perfectly balanced Komandaların gücü tamamilə taraz/eyni idi;* 3. *müh.* balans vurmaq, hesablamaq; yekun vurmaq; bağlamaq *(hesabı)*; ödəmək; **to ~ an account** hesabı ödəmək; 4. tarazlaşmaq, balans vermək, baş-başa gəlmək; *The accounts don't balance Hesab balans vermir;* 5. çəkmək, çəkini müəyyənləşdirmək; təxmini müəyyən etmək; 6. götür-qoy etmək, ətraflı düşünmək, fikirləşmək; *It was necessary to balance the matter before reaching any decision Hər hansı bir qərara gəlməzdən əvvəl məsələni ətraflı şəkildə götür-qoy etmək lazım idi;* 7. tərəddüd etmək; ləngitmək, yubatmaq, gecikdirmək; **to ~ in indecision** qərara gəlməkdə tərəddüd etmək/qətiyyətsiz olmaq

**balance-beam** ['bælənsbi:m] *n* 1. tərəzi qolu; pərsəng; 2. əks ağırlıq; 3. gimnastika tiri

**balanced** ['bælənst] *adj* 1. tarazlaşdırılmış, bərabərləşdirilmiş, tənləşdirilmiş; 2. müvazinətli; təmkinli, sakit; *She is very well balanced O, çox təmkinlidir;* 3. düşünülmüş; ağıllı; **~ judgement** düşünülmüş mühakimə; 4. həmahəng, ahəngdar, uyğun; proporsional; mütənasib; taraz; **~ composition** mütənasib/taraz tərkib; **~ reduction of armaments** silahların proporsional surətdə azaldılması

**balance-master** ['bæləns.ma:stəʳ] *n* kəndirbaz, canbaz, ekvilibrist

**balance-mistress** ['bæləns.mɪstrɪs] *n* qadın /qız ekvilibrist, kəndirbaz qadın/qız, canbaz qadın / qız

**balancer** ['bælənsəʳ] *n* ekvilibrist, akrobat, canbaz

**balconied** ['bælkənɪd] *adj* balkonlu, eyvanlı; **~ house** balkonlu/eyvanlı ev

**balcony** ['bælkənɪ] *n* 1. balkon, eyvan; 2. *teat.* balkon

**bald** [bɔ:ld] *adj* 1. daz, dazbaş, başının tükü tökülmüş; *He is going bald Onun başının tükü tökülür, O keçəlləşir;* 2. çılpaq; örtüksüz; **~ hill** çılpaq təpə; 3. açıq, aydın; **~ egoism** çılpaq/açıq xudbinlik/eqoizm; **~ rudeness** açıq / aydın kobudluq; 4. boş, mənasız; 5. kasıb, cılız; zəif; **~ prose** kasıb/cılız/zəif nəsr; **~ style** zəif /cılız üslub; 6. təpəl *(heyvan haq.)*

**bald-coot** ['bɔ:ldku:t] *n* 1. *zool.* qaşqaldaq *(quş)*; 2. dazbaş adam, keçəl adam; *He's as bald as a coot O lap keçəldir, O büsbütün keçəldir*

**balderdash** ['bɔ:ldədæʃ] *n* 1. cəfəngiyyat, boş söz, mənasız danışıq və ya yazı; axmaq söz; uydurma; 2. burda *(bulanıq və dadsız içki)*

**bald-faced** ['bɔ:ld'feɪst] *adj* 1. təpəl, qaşqa *(at haq.)*; 2. açıq, aşkar, aydın; **~ lie** açıq / aşkar / ağ yalan

**bald-head** ['bɔ:ldhed] *n* 1. dazbaş adam; 2. təpəl / qaşqa heyvan

**bald-headed** ['bɔ:ld'hedɪd] *adj* 1. daz, keçəl; 2. açıq, aşkar
**balding** ['bɔ:ldɪŋ] *adj* dazlaşan, keçəlləşən; **~ man / head** dazlaşan adam / baş
**baldly** ['bɔ:ldlɪ] *adv* 1. açıq, açıqcasına, açıq-açığına, aşkarcasına; üzünə; **to speak ~** açıq/açıqcasına demək; *The doctor told him quite baldly that he fell ill with cancer Həkim açıq-açığına dedi ki, o, xərçəng xəstəliyinə tutulub;* 2. kasıb, dilənçi şəklində; *The room was baldly furnished Otaq çox kasıb şəkildə döşənmişdi*
**baldness** ['bɔ:ldnɪs] *n* 1. dazlıq; keçəllik, 2. çılpaqlıq, örtüksüzlük; **the ~ of the hill** təpənin çılpaqlığı
**baldric** ['bɔ:ldrɪk] *n* 1. asqı qayışı, çiyin qayışı *(silah asmaq üçün)*
**bale**[1] ['beɪl] *n* top; topa; tay; yığın; bağlama; **a ~ of cotton** bir tay pambıq; **~s of clothes** paltar bağlamaları
**bale**[2] [beɪl] *v* topa / tay bağlamaq
**baleful** ['beɪlfl] *adj* 1. hirsli, acıqlı, qəzəbli, kinli; **~ look** hirsli/acıqlı/kinli/qəzəbli baxış; **to give a ~ look** hirsli / acıqlı nəzər salmaq/baxmaq; 2. çox zərərli / ziyanlı, fəlakətli, öldürücü; 3. *arx.* qəmgin, qəmli, qüssəli, dərdli, kədərli, pərişan
**balefully** ['beɪlfəlɪ] *adv* acıqla, hirslə, qəzəblə, kinlə, kinli-kinli, acıqlı-acıqlı; **to look ~** acıqlı-acıqlı / kinli-kinli baxmaq
**baleless** ['beɪllɪs] *adj d.d.* zərərsiz, ziyansız
**bale out** ['beɪl'aut] *v* təyyarə qəzası zamanı paraşütlə xilas olmaq
**balk**[1] [bɔ:k] *n* 1. əngəl, çətinlik; maneə; **to proceed without ~s** maneəsiz/çətinliksiz hərəkət etmək; 2. səhv, xəta, yanlışlıq; nöqsan; **to make a ~** xəta etmək, nöqsan buraxmaq; 3. məğlubiyyət; ümidsizlik, ümidi kəsilmə; **to meet with a ~** məğlub olmaq, məğlubiyyətə uğramaq; **to have a sad ~** bərk məyus olmaq; ◊ **to make a ~ of good ground** əlverişli imkanı əldən vermək
**balk**[2] [bɔ:k] *v* 1. mane olmaq, maneçilik törətmək; **to ~ progress** tərəqqiyə mane olmaq; **to be ~ed of** ***one's*** **purpose** məqsədinə nail olmamaq / çatmamaq; *The enemy is balked düşmənin hərəkəti dayandırılıb;* 2. əldən vermək, ötürmək; yan keçmək; diqqət verməmək; **to ~ an opportunity** imkanı əldən vermək; **to ~** ***one's*** **turn** növbəsini buraxmaq; *Death balks no creature Ölüm heç bir canlıdan yan keçmir;* 3. rədd etmək, razı olmamaq, qəbul etməmək; boyun qaçırmaq; **to ~ an unpleasant duty** xoşagəlməz vəzifədən boyun qaçırmaq; 4. inad etmək, tərslik etmək; qəfildən dayanmaq; tərsliyi tutmaq; *The horse balked a leap At maneəni dəf etməyə tərslik etdi*
**balky** [bɔ:kɪ] *adj* tərs, inad; harın *(at haq.)*
**ball**[1] [bɔ:l] *n* I 1. kürə, şar; yumaq; **the terrestrial ~** yer kürəsi / şarı; *The Earth is a ball Yer kürə / şar şəklindədir;* **a ~ of wool** yun yumağı; **meat ~s** küftə, frikadel *(xırda küftəyəoxşar xörək)*; **~ of eye** *anat.* göz almacığı; **~ of the knee** *anat.* diz qapağı; 2. top; *The ball is in the play Top oyundadır; The ball is out of the play Top oyundan çıxıb;* **good ~** dəqiq zərbə *(topa)*; **wide ~** dəqiq olmayan zərbə *(topa)*; **adopted ~** hesaba alınan top; 3. güllə, mərmi; qumbara; **powder and ~s** barıt və güllələr; **smoke ~** *hərb.* tüstü mərmisi / bombası; 4. *amer.* beysbol; **to play ~** beysbol oynamaq
**ball** [bɔ:l] *n* II bal, rəqs gecəsi; **costume ~** balmaskarad; **to give a ~ ball** bal təşkil etmək; **to open the ~** balı açıq elan etmək
**ball**[2] [bɔ:l] *adj* şaraoxşar, kürəyəoxşar, şarvari; kürəvari; **~ lightning** şaraoxşar ildırım;
◊ **~ of fortune** taleyin oyuncağı; **~ of fire** od parçası *(qoçaq adam haq.)*; **to carry the ~** *amer.* fəal hərəkət etmək; **to have the ~ at** ***one's*** **feet** müvəffəqiyyət qazanmağa imkanı / şansı olmaq; **to play ~ with** əməkdaşlıq etmək *(bir kəslə)*
**ball**[3] [bɔ:l] *v* yumağa dönmək, yumaq kimi olmaq; yumrulamaq, bürmələmək
**ballad** ['bæləd] *n* ballada; xalq nəğmələri
**ballade** ['bæla:d] *n* ballada *(şerin xüsusi növü)*
**ballast**[1] ['bæləst] *n* ballast *(gəminin, aerostatın və s. tarazlığını saxlamaq üçün götürülən yük və ya başqa ağırlıq)*
**ballast**[2] ['bæləst] *v* 1. ballastla yükləmək *(gəmini, aerostatı)*; 2. sabitləşdirmək; azaltmaq, məhdudlaşdırmaq; **to ~ impetuosity** qızğınlığı / coşğunluğu azaltmaq
**ball-bearing** ['bɔ:lbeərɪŋ] *n tex.* diyircəkli podşipnik
**ballerina** [ˌbælə'rɪ:nə] *n* balerina, rəqqasə
**ballerine** [ˌbælə'rɪ:n] *n* **balerina** *isminin cəm forması*
**ballet**[1] ['bæleɪ] *n* balet
**ballet**[2] ['bæleɪ] *adj* balet; **~ slippers** balet tuflisi; **~ music** balet musiqisi
**ballet-dancer** ['bæleɪˌda:nsə'] *n* balet artisti, rəqqas; balet aktrisası, rəqqasə, balerina
**ballet-master** ['bæleɪˌma:stə'] *n* baletmeyster, balet rəhbəri
**balletomane** [ˌbælətə'meɪn] *n* balet həvəskarı, balet aludəsi, baleti sevən
**ballistic** [bə'lɪstɪk] *adj* ballistik; **~ rocket** ballistik raket; **~ missile** ballistik reaktiv mərmi; **~ guided missile** idarə olunan ballistik mərmi
**ballistics** [bə'lɪstɪks] *n* ballistika *(güllələrin və ya ağır cisimlərin uçuşundan bəhs edən elm)*
**ballocks** ['bɒləks] *n anat. tab. s.* daşşaq
**balloon**[1] [bə'lu:n] *n* 1. hava şarı; **toy ~** oyuncaq hava şarı; **dirigible/navigable ~** idarəolunan hava şarı; 2. balon *(dar boğazlı şüşə və ya dəmir qab)*
**balloon**[2] [bə'lu:n] *v* 1. köpmək, şişmək; *His ckeeks ballooned (out) as he played the trumpet O, trubanı çalarkən ovurdları şişirdi;* 2. doldurmaq *(hava ilə)*, üfürüb şişirtmək; 3. hava balonunda uçmaq



**balloonist** [bə'lu:nɪst] *n* aeronavt *(uçucu aparatda uçan adam)*
**ballot**[1] ['bælət] *n* 1. seçki bülleteni; *Don't spoil your ballot by writing in the wrong place Səhv yazmaqla seçki bülletenini korlama / korlamayın;* 3. səs vermə, səsə qoyma; gizli səsvermə; **to vote / to elect by ~** gizli səsvermə yolu ilə seçmək; **to take a ~** səsvermə keçirmək; 4. səsverməyə qoymaq üçün namizədlərin siyahısı; 5. səsvermənin nəticəsi; *They are counting the ballots now Onlar indi səsvermənin nəticəsini sayırlar;* 6. verilən səslərin sayı; 7. püşk / çöp atma
**ballot**[2] ['bælət] *v* 1. gizli seçki keçirmək; 2. səs vermək; **to ~ for** ***smb.*** bir kəsə səs vermək; *They have balloted for the new chairman, but nobody knows the result yet Onlar yeni sədr seçmək üçün səs verdilər, amma heç kəs səsvermənin nəticəsini hələ də bilmir;* 3. püşk çıxartmaq *(qutudan və s.)*
**ballot-box** ['bælətbɒks] *n* seçki qutusu; **to stuff the ~** *amer.* seçkini saxtalaşdırmaq
**ballot-paper** ['bælətˌpeɪpə'] *n* seçki bülleteni
**ball-point pen** ['bɔ:lpɔɪnt'pen] *n* diyircəkli qələm
**ball-room** ['bɔ:lru:m] *n* rəqs otağı / zalı
**ballyhoo** [ˌbælɪ'hu:] *n* 1. səs-küy, qalmaqal, hay-haray; *What's all the ballyhoo about? Bu nə səs-küydür / qalmaqaldır / hay-küydür? Nə olub, bu nə deməkdir?;* 2. cəfəngiyyat, laqqırtı
**balm**[1] [ba:m] *n* 1. balzam, mumiya; 2. *məc.* müalicə vasitəsi, dərman, dava; **to pour ~ into** ***smb.'s*** **wounds** bir kəsin yarasına balzam qoymaq; 3. ruhi sakitləşdirici vasitə; məlhəm; *Your kind words come like balm to my hurt feelings Sənin/Sizin sözlərin/sözləriniz mənim təhqir olunmuş hisslərimə elə bil məlhəm oldu;* 4. *bot.* balzam ağacı
**balm**[2] [ba:m] *v* 1. sakitləşdirmək, rahatlaşdırmaq, sakit etmək; ağrını kəsmək; 2. balzamlamaq, mumiyalamaq; məlhəm qoymaq
**balmy** ['ba:mɪ] *adj* 1. ətirli, xoşiyli; **~ sap** ətirli şirə; **the ~ breath of spring** baharın xoş ətirli nəfəsi; 2. zərif, incə, şirin; **the ~ slumbers of youth** gəncliyin şirin yuxusu; 3. müalicəvi; sakitləşdirici, sakitedici; **~ ointment** məlhəm, müalicəvi / sakitləşdirici maz
**baloney** [bə'lounɪ] *n* = **boloney**
**balsam**[1] ['bɔ:lsəm] *n* 1. balzam; **~ of fir** *əcz.* şam ekstratı; 2. balzam verən şam ağacı
**balsam**[2] ['bɔ:lsəm] *v* 1. balzamlamaq, balzam sürtmək; 2. *məc.* sakitləşdirmək, rahatlaşdırmaq, ağrını kəsmək
**balsamic** [bɔ:l'sæmɪk] *adj* 1. ətirli; 2. sakitləşdirən, sakitləşdirici
**balsamine** ['bɔ:lsəmɪn] *n bot.* balzamin, xınaçiçəyi
**balusters** ['bæləstəz] *n mem.* balyustrada, sürahibənd, bəzəkli / naxışlı məhəccər, bəzəkli/naxışlı sürahi, sürahi, məhəccər; hasar
**balustered** ['bæləstəd] *adj* məhəccərli, sürahili
**balustrade** [ˌbæləs'treɪd] *n mem.* balyustrada, sürahibənd; məhəccər, sürahi
**bamboo**[1] [bæm'bu:] *n bot.* bambuk *(içərisi boş, çox bərk və yoğun qamışa oxşar bitki)*
**bamboo**[2] [bæm'bu:] *v* bambuk ağacı ilə döymək / vurmaq
**ban**[1] [bæn] *n* 1. yasaq, qadağa, qadağan/yasaq etmə; **to be under a ~** qadağan olunmaq, yasaq edilmək; **to put under a ~** qadağa qoymaq, yasaq etmək; **to lift the ~** qadağanı götürmək; **to declare a ~ on smoking in theatres** teatrlarda papiros çəkməyə qadağa qoymaq; 2. qanundan kənar elan etmə; qovma, qovulma, sürgün etmə /edilmə; **to keep** ***one's*** **~** sürgündə yaşamaq; **to break** ***one's*** **~** qovulma haqqında əmri pozmaq
**ban**[2] [bæn] *v* (-nn-) qadağan/yasaq qoymaq/ etmək; **to ~ a play/a demonstration/a meeting** pyesi/ nümayişi/ toplantını qadağan etmək; **to ~ a newspaper** qəzeti bağlamaq
**banal** [bə'na:l] *adj* mənasız, boş, çürük, bayağı, çeynənmiş, şit, duzsuz; **a ~ remark** mənasız / bayağı irad; **~ idea** çeynənmiş / mənasız fikir
**banality** [bə'nælɪtɪ] *n* mənasızlıq, məzmunsuzluq; şitlik, bayağılıq; şit/bayağı/ədəbsiz söz; **to utter banalities** mənasız /bayağı danışmaq, boş-boş şeylər danışmaq
**banana** [bə'na:nə] *n* 1. *bot.* banan; 2. banan *(meyvə)*; **a bunch of ~s** bir salxım banan
**band**[1] [bænd] *n* 1. tesma, lent, şərid, bağ, sarğı; **crepe ~** matəm sarğısı; 2. əlaqə; **the ~s of matrimony** kəbin əlaqələri
**band**[2] [bænd] *v* 1. bağlamaq, birləşdirmək; *The packages were banded together in one lot Bağlamalar bir yerdə bağlandı;* 2. birləşdirmək; **to ~ people together** adamları birləşdirmək; 3. birləşmək, ittifaqa daxil olmaq; *The people banded together against the common enemy Xalq ümumi düşmənə qarşı mübarizədə birləşdi*
**bandage**[1] ['bændɪdʒ] *n* bint, sarğı; **to put a ~** sarımaq, sarğı qoymaq; *They put a bandage over his eyes Onun gözünə sarğı qoydular, Onun gözünü sarıdılar*
**bandage**[2] ['bændɪdʒ] *v* sarımaq, bağlamaq; sarğı qoymaq; **to ~** ***smb.'s*** **eyes** bir kəsin gözünə sarğı qoymaq; *The doctor bandaged (up) his broken leg Həkim onun sınmış ayağına sarğı qoydu*
**b and b** [ˌbɪənd'bɪ] **bed and breakfast** *birləşmənin qısa forması: şəhərlərdə kiçik mehmanxanalarda və ya xüsusi evlərdə müsafirlərə gecələmək üçün yer və səhər yeməyi vermə*
**bandbox** ['bændbɒks] *n* qadın şlyapaları üçün yüngül karton qutu

**bandeau** [ˈbændou] *n fr.* saç üçün lent/çənbər
**bandit** [ˈbændɪt] *n* quldur, yolkəsən, çapqınçı, soyğunçu, bandit
**banditry** [ˈbændɪtrɪ] *n* quldurluq, çapqınçılıq, soyğunçuluq, banditlik; *The national police are trying to stop all this banditry Milli polis bütün bu quldurluğa son qoymağa çalışır*
**banditti** [bænˈdɪtɪ] *n* **bandit** *isminin cəm forması*
**bandmaster** [ˈbænd‚ma:stəʳ] *n* drijor *(xüs. nəfəsli orkestrdə)*
**bandog** [ˈbændɔg] *n* **1.** sərt it, quduz köpək; **2.** axtarıcı it *(cinayətkarı və ya oğurlanmış şeyi axtarıb tapan it cinsi)*
**bandolear** [‚bændəˈlɪəʳ] *n* döşdə gəzdirilən qatar *(patron daşımaq üçün)*
**bandolier** [‚bændəˈlɪəʳ] *n* = **bandolear**
**bandsman** [ˈbændzmən] *n* (*pl* **-men** [men]) orkestrdə çalan musiqiçi
**bandstand** [ˈbændstənd] *n* orkestr üçün estrada *(açıq səhnə)*
**bandy**[1] [ˈbændɪ] *adj* əyri *(ayaq haq.)*
**bandy**[2] [ˈbændɪ] *v* **1.** bir-birinə atmaq *(topu və s.)*; **to ~ a ball** topu bir-birinə atmaq; **2.** *məc.* deyişmək, bir-birinə söz atmaq; **to ~ words** mübahisə etmək, deyişmək, çənələşmək; **to ~ looks** bir-birinə baxmaq, gözləşmək; *How dare you bandy words with me? Sən / Siz hansı cəsarətlə mənimlə söz güləşdirirsən/güləşdirirsiniz? Sən / Siz hansı cəsarətlə mənə etiraz edirsən / edirsiniz?* **3.** müzakirə etmək, ağızdan-ağıza salmaq; **to ~ a rumour** şayiə yaymaq; **4.** rəqabət aparmaq; mübarizə etmək; **to ~ with nature** təbiətlə mübarizə etmək
**bandy-legged** [ˈbændɪlegd] *adj* əyriayaq, əyriqıç, ayaqları əyri; ~ **boy** əyriayaq oğlan
**bane**[1] [beɪn] *n* zəhər, ağı; *Her neighbours were the bane of her life Qonşuları onun həyatını zəhərə döndərmişdilər*
**bane**[2] [beɪn] *v arx.* zəhərləmək; məhv etmək
**baneful** [beɪnfəl] *adj* **1.** məhvedici, öldürücü, xətərli; fəlakətli, zərərli; **a ~ influence** zərərli / məhvedici təsir; **the ~ effect of alchohol** alkoqolun məhvedici/zərərli /fəlakətli təsiri; **2.** zəhərli, ağılı; ~ **mushroom** zəhərli / ağılı göbələk
**bang**[1] [bæŋ] *n* I **1.** güclü zərbə; *He got a nasty bang on the head O, başından bərk zərbə aldı, Onun başına bərk zərbə vurdular; The door shut with a bang Qapı şappıltı ilə örtüldü;* **2.** qəfil səs; partlayış; atəş; **to shut the door with a ~** qapını bərk çırpmaq; *The gun went off with a loud bang Güclü atəş səsi eşidildi;*
◊ **to go over with a ~** çox yaxşı/çox gözəl keçmək *(tamaşa və s. haq.)*; səs-küylü müvəffəqiyyət qazanmaq; **to come up with a ~** yeni qüvvə ilə meydana / üzə çıxmaq
**bang** [bæŋ] *n* II tel, alında düz kəsilmiş saç
**bang**[2] [bæŋ] *v* I **1.** vurmaq; zərbə endirmək; **to ~ the table with one's fist** yumruqla stola vurmaq; **2.** çalmaq; **to ~ a drum** təbil çalmaq; **3.** dəymək, toxunmaq; **to ~ against *smth.*** bir şeyə dəymək; **to ~ oneself against a tree** özünü ağaca çırpmaq; *He banged his head as he went through the doorway Qapıdan içəri girərkən onun başı qapının üst tirinə dəydi; He banged the chair against the wall O, stulu divara çırpdı;* **4.** örtmək, çırpmaq *(qapını)*; **to ~ the door** qapını çırpmaq; **5.** örtülmək, çırpılmaq; *The door banged after him Qapı onun arxasınca/dalınca çırpıldı;* **6.** guruldamaq; partlamaq; *The gun banged Top guruldadı;* **to ~ down** şaqqıltı ilə örtmək; **to ~ a window/a door down** pəncərəni / qapını şaqqıltı ilə örtmək;
◊ **to be ~ed up about *smth.*** bir şeydən səbəbdən əsəbiləşmək
**bang** [bæŋ] *v* II saçı kəkil kəsmək; *The girls had their hair banged low over their foreheads Qızlar saçlarını alınlarının üstündə kəkil kəsdirmişdilər*
**bang**[3] [bæŋ] *adv* düz, tən, lap; *The lights went out bang in the middle of the performance İşıqlar düz/lap tamaşanın ortasında söndü*
**bangle** [ˈbæŋgl] *n* **1.** qolbaq, bilərzik; halqa; **with ~s in their noses** burunlarında halqa; **2.** pilək
**bang-tail** [ˈbæŋteɪl] *n* qısa qırxılmış quyruq *(atlarda)*
**banish** [ˈbænɪʃ] *v* **1.** qovmaq; sürgün etmək, **to ~ from the house** evdən qovmaq; *The native population was banished from the island by the colonialists Yerli əhali müstəmləkəçilər tərəfindən adadan qovuldu / sürgün edildi;* **2.** başından çıxartmaq, özündən uzaqlaşdırmaq, unutmaq; *(fikri və s.)*; *The doctor said that she must banish fear Həkim dedi ki, o, qorxunu başından çıxartmalıdır*
**banishment** [ˈbænɪʃmənt] *n* qovma, qovulma; sürgün, sürgün etmə/edilmə; ~ **for life** ömürlük sürgün
**banister** [ˈbænɪstəʳ] *n* məhəccər
**banjo** [ˈbændʒou] *n* (*pl* **-os, -oes** [-ouz]) banco *(Amerika zəncilərinin simli musiqi aləti)*
**bank**[1] [bæŋk] *n* I **1.** bənd, sədd; qum təpəsi; torpaq təpəsi; qalaq, damba, torpaq bənd; topa; **to dig up a ~ of earth** torpaq bəndi / səddi çəkmək; *The banks of dark cloud promised a heavy storm Qara bulud topası bərk tufandan xəbər verirdi;* **2.** dik / sərt/sıldırımlı eniş, dik/sərt yamac; *They had come up the bank of the hill Onlar təpənin dik yamacı ilə dırmaşıb çıxdılar;* **3.** sahil *(çayın, gölün)*; **the ~ of the river** çayın sahili; *The river overflowed its banks Çay daşıb sahili basdı;* **4.** dayaz yer, banka *(dənizin dibindəki hündürlük)*; rif *(sualtı qayalar)*; yığın, qalaq, təpə; **snow ~s** qar yığını; **5.** bilyard stolunun bortu / kənarı
**bank** [bæŋk] *n* II **1.** bank; **B. of England, the B.** İngilis Bankı *(İngiltərənin dövlət bankı)*; ~ **of issue/of circulation** emissiya bankı; **branch ~** sahə bankı; **to keep an account at a ~** bankda hesabı olmaq; **to keep an account with N.B.** dövlət bankında hesabı olmaq; **2.** fond, ehtiyat; ümumi ehtiyat; **blood ~ 1)** qan fondu / ehtiyatı *(köçürmək üçün)*; **2)** donor məntəqəsi; **3.** bank *(qumar oyununda)*; **to keep the ~** bank qoymaq; **to break the ~** bankı udmaq *(qumarda)*;
◊ **to keep *smth.* in the ~** bir şeyi ehtiyatda saxlamaq



**bank**[2] [bæŋk] *adj* bank; ~ **account** bank hesabı; ~ **deposit** bank əmanəti; ~ **clerk** bank işçisi; ~ **blood** köçürmə üçün qan; ~ **letter** maliyyə bülleteni
**bank**[3] [bæŋk] *v* I **1.** kürümək, kürəyib yığmaq, kürəyib topa yığmaq; **to ~ snow** qarı kürəyib topa vurmaq/yığmaq; **2.** üstünə yığmaq, bir-birinin üstünə yığmaq, topalamaq; **to ~ chairs one upon the other** stulları bir-birinin üstünə yığmaq; **3.** əhatə etmək, əhatələnmək; *The lake was banked by the forest from three sides Göl üç tərəfdən meşə ilə əhatələnmişdi*
**bank** [bæŋk] *v* II **1.** banka pul qoymaq, pulu bankda saxlamaq; bankda/əmanət kassasında pulu olmaq; *Where do you bank? Sən/Siz pulunu/pulunuzu hansı bankda saxlayırsan /saxlayırsınız?* **to ~ at/with the B. of England 1)** ingilis bankında pul saxlamaq; **2)** ingilis bankı ilə əməkdaşlıq etmək; **2.** bankir olmaq, bank sahibi olmaq, bank işi ilə məşğul olmaq; **3.** əmlakı pula çevirmək; **to ~ an estate** mülkü/mali-kanəni satmaq; **4.** bank atmaq *(qumarda)*; **5.** **(on, upon)** *d.d.* güvənmək, arxalanmaq, bel bağlamaq, ümid olmaq/etmək; **to ~ on/upon *smb.'s* support** bir kəsə bel bağlamaq, bir kəsə arxalanmaq / güvənmək; *I was banking on his honesty when I closed the deal Mən sövdə/saziş bağlayanda, onun vicdanlılığına/düzlüyünə bel bağladım; You can bank on it being true Sən/Siz onun doğru olmasına bel bağlaya bilərsən / bilərsiniz*
**bank-bill** [ˈbæŋkbɪl] *n mal.* banka qoyulan barat vekseli
**bank-book** [ˈbæŋkbuk] *n* əmanət kitabçası, şəxsi hesab
**banker** [ˈbæŋkəʳ] *n* **1.** bankir, bank sahibi; **2.** bank işçisi; **3.** bank qoyan, kart paylayan oyunçu *(qumarda)*
**banking** [ˈbæŋkɪŋ] *n mal.* bank işi
**banking-house** [ˈbæŋkɪŋhaus] *n* bank, bank idarəsi
**bank-note** [ˈbæŋknout] *n* kağız pul, kredit bileti
**bankrupt**[1] [ˈbæŋkrəpt] *n* bankrot, müflis, var-yoxu əlindən çıxan adam; **moral ~** mənəviyyatca müflisləşmiş; **mental ~** məsələləri həll etmək iqtidarında olmayan adam; intellekt baxımından müflisləşmiş adam; **a ~ in love** məhəbbətdə uğursuz adam; **~ in honour** şərəfsiz adam; **a ~ to all manner of understanding** bir damcı dərrakəsi olmama;
◊ **to play the ~** *arx.* **1)** başqasının pulunu xərcləmək; **2)** inamı/etimadı doğrultmamaq
**bankrupt**[2] [ˈbæŋkrəpt] *adj* bankrot olmuş, müflisləşmiş, var-yoxdan çıxmış, borcunu verə bilmək imkanı olmayan; **to be/to turn/to become ~** müflis olmaq; var-yoxdan çıxmaq; **to make ~ 1)** müflisləşdirmək, müflis etmək, var-yoxdan çıxarmaq; **2)** borcunu ödəyə bilməmək; doğrultmamaq *(etimadı və s.)*; **to be morally ~** mənəviyyatca müflisləşmək, mənəviyyatını itirmək, mənəviyyatsızlaşmaq; **to go ~** müflisləşmək, bankrot olmaq; *The company went bankrupt because it couldn't sell its products Şirkət məhsullarını sata bilmədiyi üçün müflisləşdi/bankrot oldu*
**bankrupt**[3] [ˈbæŋkrəpt] *v* bankrot etmək, müflisləşdirmək, var-yoxdan çıxartmaq
**bankruptcy** [ˈbæŋkrəptsɪ] *n* **1.** *mal. hüq.* bankrotluq, müflislik, var-yoxdan çıxma; **fraudulent ~** qərəzlə / qəsdlə edilmiş bankrotluq; **2.** müvəffəqiyyətsizlik, uğursuzluq, iflas, iflasa uğrama *(siyasətçilər və s. haq.)*; *The bankruptcy of the government's plans became clear when prices rose steeply Qiymətlər sürətlə qalxdıqda dövlət planlarının iflasa uğraması aydın oldu*
**bank-stock** [ˈbæŋkstɔk] *n* bankın aksioner kapitalı
**banner**[1] [ˈbænəʳ] *n* bayraq; **red ~** qırmızı /qızıl bayraq; **the ~ of revolution/freedom/peace/independence** inqilab/azadlıq / sülh / müstəqillik bayrağı; **under the ~ of national liberation** milli azadlıq bayrağı altında; **to join / to follow the ~ of 1)** bayrağı altında olmaq; **2)** *məc.* bir kəsin tərəfini saxlamaq; **to unfurl *one's* ~ 1)** bayrağını qaldırmaq; **2)** öz proqramını / fikrini açıqlamaq
**banner**[2] [ˈbænəʳ] *adj* ən yaxşı, nümunəvi; aparıcı; **a ~ year for business** biznes üçün ən yaxşı il; **~ occasion** əla imkan; **of the ~ class** ən əla, ən yaxşı; **~ investment** ən gəlirli kapital qoyuluşu
**banner**[3] [ˈbænəʳ] *v* **1.** bayraqla bəzəmək, bayraqla təmin etmək; **2.** bayraq altına toplamaq / yığmaq
**banner-bearer** [ˈbænə‚beərəʳ] *n* bayraqdar, bayraqçı, bayraq aparan
**banns** [bænz] *n pl* evlənmək niyyətində olan şəxslərin adlarının açıqlanması *(kilsədə və ya digər qanuni yerdə)*; **to ask / to call /to publish /to put up the ~** gələcək izdivacı/kəbini elan etmək; **to forbid the ~** izdivacı/ kəbini qadağan etmək
**banquet**[1] [ˈbæŋkwɪt] *n* böyük qonaqlıq, ziyafət, keyf məclisi, banket; **to give a ~** ziyafət / banket vermək
**banquet**[2] [ˈbæŋkwɪt] *adj* ziyafət, banket; **~ hall** ziyafət / banket zalı
**banquet**[3] [ˈbæŋkwɪt] *v* **1.** qonaqlıqda olmaq; kef

eləmək; bayram etmək; 2. banket / ziyafət vermək

**banqueter** ['bæŋkwɪtəʳ] *n* ziyafətdə/banketdə iştirak edən qonaq

**bantam** ['bæntəm] *adj* 1. kiçik, balaca; xırda; kiçik qabaritli; portativ, yüngül; ~ **car** balaca yük maşını, cip; 2. alçaq, qısaboy, alçaq boylu, bəstəboy; 3. *id.* ən yüngül

**bantam-weight** ['bæntəmweɪt] *n id.* ən yüngül çəkili boksçu / güləşçi

**banter**[1] ['bæntəʳ] *n* zarafat, mehriban zarafat; zarafatyana söhbət

**banter**[2] ['bæntəʳ] *v* 1. mehribanlıqla zarafat etmək; 2. sataşmaq, ələ salmaq, lağa qoymaq, oynatmaq

**banterer** ['bæntərəʳ] *n* rişxəndçi, masqaraçı, adam ələ salan

**baptism** ['bæptɪzm] *n* xaç suyuna salma, xristianlığa qəbul olunma mərasimi; **name of** ~ xaç suyuna salınarkən verilən ad; ~ **of blood** 1) din yolunda əzab çəkmə / şəhid olma; 2) *hərb.* ilk yaralanma; bölmənin ilk itkisi; ~ **of fire** ilk iştirak/sınaq *(döyüşdə)*

**baptismal** [bæp'tɪzml] *adj* xaç suyuna salma mərasiminə aid olan; xaç suyuna salınmış; xaç; ~ **water** xaç suyu; ~ **name** xaç adı, xaç suyuna salınarkən verilən ad; ~ **certificate** xaç suyuna salınma haqqında verilən şəhadətnamə

**baptist** [bæptɪst] *n* 1. xaç suyuna salan; 2. baptist, baptizm tərəfdarı

**baptize, -ise** [bæp'taɪz] *v* 1. xaç suyuna salmaq; xaç suyuna salma mərasimi keçirmək; 2. xaç suyuna salınmaq, xristian olmaq; 3. xaç adı vermək

**bar**[1] [ba:] *n* I 1. parça, bir parça; tir, dirək; **wooden** ~ ağac tir, ~ **of metal** dəmir parçası; **a** ~ **of soap** bir parça sabun; **a** ~ **of chocolate** bir plitka şokolad; 2. briket *(kərpic şəklində preslənmiş kömür, torf, filiz və s.)*; 3. əridilib qəlibə tökülmüş polad; külçə; **a** ~ **of copper** mis külçəsi; **a** ~ **of gold** qızıl külçəsi; 4. rəzə, siyirmə; qapı sürgüsü; **the** ~ **of a door/a gate** qapı /darvaza rəzəsi; 5. şlaqbaum; 6. zolaq; *As the sun went down, there was a bar of red across the sky Günəş batarkən səmada qırmızı zolaq əmələ gəldi;* 7. *pl* barmaqlıq; **behind the** ~**s** barmaqlıq arxasında, məhbəsdə; 8. köndələn tir *(gimnastik alət)*; 9. paralel *(uzun tirlərdən ibarət gimnastika qurğusu)*; 10. maneə, baryer; ~ **to happiness** xoşbəxtlik üçün maneə; ~ **to economic development** iqtisadi inkişaf yolunda maneə; **to let down the** ~**s** məhdudiyyətləri aradan götürmək/ləğv etmək; *Poor health may be a bar to success in one's studies Zəif sağlamlıq təhsildə müvəffəqiyyət üçün maneə ola bilər;* **language** ~ dil baryeri;
◊ **to cross the** ~ dünyasını dəyişmək, ölmək

**bar** [ba:] *n* II bar, bufet, qəlyanaltı

**bar**[2] [ba:] *v* (-rr-) 1. rəzələmək, bağlamaq *(rəzə ilə)*; **to** ~ **the door** qapını rəzələmək/rəzə ilə bağlamaq; 2. pəncərəyə barmaqlıq vurmaq; 3. bağlamaq, tutmaq; kəsmək; *The exits were barred Çıxışlar bağlanmışdır/kəsilmişdir; A fallen tree is barring the way Yıxılmış ağac yolu kəsmişdi; The soldiers barred the way Əsgərlər yolu kəsmişdilər;* 4. mane olmaq, qarşısını almaq; **to** ~ **progress** tərəqqiyə mane olmaq; **to** ~ **economic development** iqtisadi inkişafa mane olmaq, iqtisadi inkişafın qarşısını almaq; *What bars you from coming to the theatre with us? Bizimlə teatra getməyə sənə/sizə nə mane olur?*; 5. qadağan/yasaq etmək; **to** ~ **from fishing** balıq tutmağı yasaq/qadağan etmək

**bar**[3] [ba:] *prep arx.* başqa; *I can come any day bar Monday Mən bazar ertəsindən başqa istənilən gün gələ bilərəm; The whole group was at the meeting bar John Condan başqa bütün qrup iclasda idi*

**barb** [ba:b] *n* 1. balıq qarmağının ucu, oxun ucu; 2. *bot.* tikan *(bitkidə)*; bığcıq *(bitkidə)*

**barbarian**[1] [ba:'beərɪən] *n* 1. *tar.* barbar; 2. vəhşi, nadan, avam, cahil

**barbarian**[2] [ba:'beərɪən] *adj* barbar; ~ **tribes** barbar qəbilələr

**barbaric** [ba:'bærɪk] *adj* 1. barbar, vəhşi; ibtidai; ~ **people** barbar xalq; ~ **customs** barbar adətlər; 2. qəddar; amansız; ~ **punishment** qəddar cəza

**barbarically** [ba:'bærɪkəlɪ] *adv* 1. barbarcasına, vəhşicəsinə; 2. qəddarcasına, amansızcasına; **to punish** ~ qəddarcasına / amansızcasına cəzalandırmaq

**barbarism** ['ba:bərɪzm] *n* 1. barbarizim, barbarlıq, vəhşilik; 2. zalımlıq, kobudluq; 3. *dilç.* varvarizm *(əcnəbi sözlərin yersiz işlənməsi)*

**barbarity** [ba:'bærɪtɪ] *n* 1. qəddarlıq, vəhşilik; amansızlıq; *The barbarities of the last war must not be repeated Son müharibənin vəhşiliyi təkrar edilməməlidir;* 2. *dilç.* varvarizm *(əcnəbi sözlərin yersiz işlənməsi)*

**barbarize** ['ba:bəraɪz] *v* 1. vəhşiləşdirmək, qəddarlaşdırmaq, amansızlaşdırmaq; *The people had been barbarized by years of bad treatment İllərlə pis rəftar nəticəsində insanlar qəddarlaşdırılmışdı;* 2. yerli-yersiz əcnəbi sözlər işlətmək

**barbarous** ['ba:bərəs] *adj* 1. varvar; qəddar, qəddarcasına, qeyri-insani; ~ **warfare** müharibəni varvar metodla aparma, müharibədə vəhşilik etmə; ~ **cruelty** qeyri-insani qəddarlıq; ~ **treatment of war prisoners** müharibə əsirləri ilə qəddarcasına rəftar etmək; ~ **aspect of nuclear war** nüvə müharibəsinin qeyri-insani mahiyyəti; 2. *məc.* varvar, vəhşi; ~ **conduct** vəhşi rəftar; 3. qulaqbatırıcı *(səs haq.)*; ~ **noise** qulaqbatırıcı səs

**barbecue**[1] ['ba:bɪkju:] *n* 1. barbekyu *(cəmdəyi bütövlükdə bişirmək/qızartmaq üçün qurğu)*; 2. bütövlükdə qızardılmış donuz / qoyun və s. cəmdəyi; 3. açıq havada verilən qonaqlıq *(adətən bu halda qonaqlara şişdə qızardılmış ət verilir)*



**barbecue**[2] ['ba:bɪkju:] *v* cəmdəyi bütövlükdə qızartmaq; əti/balığı tikə-tikə şişdə qızartmaq

**barbed** [ba:bd] *adj* 1. tikanlı, tikanı olan; 2. kəskin, batan, sancan; acı, zəhərli; ~ **words** acı/zəhərli sözlər; **a** ~ **remark** zəhərli irad; ~ **hints** kəskin eyhamlar

**barbed-wire**[1] ['ba:bd'waɪəʳ] *n* tikanlı məftildən çəkilmiş çəpər / hasar

**barbed-wire**[2] ['ba:bd'waɪəʳ] *adj* tikanlı məftil; **a** ~ **fence** tikanlı məftilə çəkilmiş hasar

**barbel** ['ba:bəl] *n* I 1. *zool.* şirbit *(balıq)*; 2. bığcıq *(balıqda)*

**barbel** ['ba:bəl] *n* II *d.d. bayt.* dabaq; dabaq xəstəliyinə tutulmuş heyvan

**bar-bell** ['ba:bel] *n id.* 1. hantel; 2. *pl* ştanq *(hər iki başında şar və ya disk şəklində ağırlıq olan dəmir qol)*

**barber**[1] ['ba:bəʳ] *n* bərbər, dəllək; **at the** ~**'s** dəlləkxanada, bərbərxanada; ~**'s chair** dəllək / bərbər kreslosu

**barber**[2] ['ba:bəʳ] *adj* dəllək, bərbər; ~ **shop** dəllək / bərbər dükanı, dəlləkxana, bərbərxana

**barberry** ['ba:bərɪ] *n bot.* zirişk, zərinc

**bare**[1] [beəʳ] *adj* (-r, -st) 1. çılpaq, lüt, üryan, yalın; açıq, soyundurulmuş; ~ **knees** çılpaq dizlər; ~ **feet** yalın ayaqlar; ~ **to the waist** qurşağa qədər çılpaq/soyundurulmuş; **with** ***one's*** **head** ~ başı açıq; 2. açılmış, ifşa edilmiş; **to lay** ~ açmaq; açıb göstərmək, aşkara çıxartmaq, ifşa etmək; *He laid bare his heart before the girl O, qəlbini qıza açdı; Their plans were laid bare Onların planları ifşa edildi;* 3. boş; örtülməmiş, quru; ~ **walls** boş divarlar *(şəkilsiz)*; ~ **floor** xalça döşənməmiş döşəmə; **to sleep on** ~ **boards** quru taxta üstündə yatmaq; **to fight with** ~ **hands** boş *(silahsız)* əllə vuruşmaq; *The house stood on a bare hillside Ev çılpaq yamacda durmuşdu; The dog picked the bone bare İt sümüyü tərtəmiz gəmirdi;* ~ **flank** *hərb.* açıq cinah; 4. *el.* çılpaq, izolə edilməmiş, açıq; 5. **(of)** -sız, -siz, -suz, -süz; **a room** ~ **of furniture** mebelsiz otaq; ~ **of thought/ideas** fikirsiz, mənasız, az mənası olan, fikircə kasıb; ~ **of fear** qorxusuz, qorxu bilməyən; **to be** ~ **of credit** etibarsız, etibarı olmayan; 6. sadə, çılpaq, bəzəksiz; ~ **facts** çılpaq faktlar/dəlillər; **to tell the** ~ **truth** əsil həqiqəti demək/danışmaq; 7. minimal, ən az, ən kiçik; cüzi, xırda; ~ **possibility/chance** cüzi imkan/şans; ~ **subsistence wage** bir təhər yaşamaq üçün əmək haqqı, cüzi əmək haqqı; **elected by a** ~ **majority** azca səsçoxluğu ilə seçilmiş;
◊ ~ **weight** xalis çəki; **in** ***one's*** ~ **skin** tamamilə çılpaq / lüt, üryan

**bare**[2] [beəʳ] *v* 1. açmaq; çılpaq etmək, soyundurmaq, üryan etmək; **to** ~ ***one's*** **arm for vaccination** peyvənd vurdurmaq üçün qolunu açmaq; **to** ~ ***one's*** **head** başını açmaq; **to** ~ ***one's*** **heart/soul** ürəyini /qəlbini açmaq; **to** ~ **its teeth** dişlərini göstərmək *(heyvan haq.)*; **to** ~ **a sword** qılıncı qından çıxartmaq; 2. dağıtmaq, məhv etmək, bərbad etmək, xaraba qoymaq; *They burned the houses and bared the gardens Onlar evləri yandırdılar, bağları məhv etdilər*

**bareback**[1] ['beəbæk] *adj* = **barebacked**

**bareback**[2] ['beəbæk] *adv* yəhərsiz; **to ride** ~ yəhərsiz at minmək, atı yəhərsiz minmək

**barebacked**[1] ['beəbækt] *adj* 1. kürəyiaçıq, qurşağa qədər çılpaq; 2. yəhərsiz; ~ **horse** yəhərsiz at

**barebacked**[2] ['beəbækt] *adv* = **bareback**[2]

**barefaced** ['beəfeɪst] *adj* 1. üzüaçıq, maskasız; 2. saqqalsız, bığsız; ~ **youth** təcrübəsiz gənc; 3. açıq, açıq-aydın; **the** ~ **and open tyranny** açıq-aydın müstəbidlik; 4. utanmaz, qızarmaz; həyasız; ~ **lie** ağ yalan; ~ **imprudence** həyasızlıq, utanmazlıq

**barefacedly** ['beə.feɪstlɪ] *adv* 1. utanmadan, utanmazcasına, həyasızcasına, həyasız-həyasız; 2. açıq-açığına, açıqcasına, açıq-aydın, açıqdan-açığa

**barefacedness** ['beə.feɪstnɪs] *n* həyasızlıq, abırsızlıq, sırtıqlıq; qabalıq, kobudluq, ədəbsizlik; utanmazlıq

**barefoot** ['beəfut] *adv* ayaqyalın; **to walk** ~ ayaqyalın gəzmək

**barefooted** ['beə'futɪd] *adj* ayaqyalın; **a** ~ **child** ayaqyalın uşaq

**barehanded**[1] ['beə'hændɪd] *adj* əliyalın *(əlcəksiz, silahsız)*

**barehanded**[2] ['beə'hændɪd] *adv* əliyalın; **to fight** ~ əliyalın vuruşmaq

**bareheaded**[1] [.beəhedɪd] *adj* açıqbaş, başıaçıq

**bareheaded**[2] [.beəhedɪd] *adv* papaqsız, başını açaraq

**barelegged** ['beə'legd] *adj* corabsız, qıçıaçıq, baldırıaçıq

**barely** ['beəlɪ] *adv* 1. ancaq-ancaq, ancaq; güclə, zorla; çətinliklə; *We barely caught the train Biz qatara güclə çatdıq; It is barely 5 o'clock İndi saat ancaq beş olar;* ~ **enough food for dinner** nahara zorla / güclə çatacaq ərzaq; 2. çılpaq; yoxsul, zəif; *The room was barely furnished Otaq yoxsul bir tərzdə döşənmişdi (mebellə)*

**barenecked** ['beə'nekt] *adj* boynuaçıq; dekolteli, dekolte; ~ **dress** dekolte don *(boynu və döşü açıq)*

**bargain**[1] ['ba:gɪn] *n* 1. ticarət sazişi, razılaşma; sövdə; sövdələşmə; **good** ~ faydalı saziş; **bad/hard/losing** ~ faydasız saziş /sövdə/sövdələşmə; **to make a** ~ razılaşmaq, razılığa gəlmək *(bir şey haqqında)*; *She made a bargain with the cabman O, taksi sürücüsü ilə sövdələşdi;* **to settle / to conclude a** ~ **with** ***smb.*** bir kəslə sa-

ziş əldə etmək, bir kəslə sövdələşmək; bir kəslə razılaşmaq; **to drive a hard ~** çətinliklə qiymətləşmək, qiymət üstündə öz xeyrini güdmək/çənələşmək; **to strike a ~ 1)** sövdələşmək; 2) ucuz qiymətə almaq, faydalı saziş bağlamaq; **to bind the ~** almaq üçün beh vermək; **to be off** *(with)* **one's ~** sazişi ləğv etmək; öhdəlikdən azad olmaq; **to have the best of a ~** sazişdən ən çox fayda götürmək; *I hope you will stand by your bargain Mən ümid edirəm ki, sən / siz sözünün / sözünüzün üstündə duracaqsan / duracaqsınız; That is a bargain! Sözümüz sözdür!* 2. faydalı qiymətə satın alma, ucuz alınmış şey; **to buy at a ~** ucuz almaq, ucuz qiymətə almaq; *I picked up a bargain accidentally Mən bunu təsadüfən çox ucuz aldım; It is a bargain at this price Bu qiymətə o demək olar ki, havayıdır*

**bargain²** [ˈba:gın] *adj* satış; **~ counter** ucuzlaşdırılmış malların satış piştaxtası; **~ basement** univermağın ucuzlaşdırılmış mallar şöbəsi *(çox vaxt zirzəmidə)*

**bargain³** [ˈba:gın] *v* 1. qiymətləşmək, qiymət danışmaq; sövdələşmək; danışıq aparmaq, razılaşmaq; şərtləşmək; **to ~ for better conditions** şərti yaxşılaşdırmaq haqqında danışmaq, şəraiti yaxşılaşdırmağı tələb etmək; 2. saziş bağlamaq, razılaşmaq; *We bargained with her about the price Biz onunla qiymət barəsində razılığa gəldik; The trade union bargained that its members should have another week's holiday Həmkarlar təşkilatı müqavilə bağladılar ki, onun üzvlərinə əlavə olaraq bir həftə məzuniyyət verilsin;* **to ~ for** gözləmək, qabaqcadan görmək; *I had not bargained for such heavy rain, and I got very wet without coat Mən belə güclü yağış yağacağını gözləmirdim və paltomu geymədiyimə görə bərk islandım*

**barge¹** [ba:dʒ] *n* 1. barja; barka *(yük daşımaq üçün yastıdibli, palubasız böyük çay gəmisi)*; 2. kater *(motorlu və ya yelkənli kiçik gəmi)*; 3. ekskursiya/turist paroxodu; 4. *k.t.* qotman vuran maşın

**barge²** [ba:dʒ] *v* 1. barja ilə daşımaq; 2. yavaş-yavaş hərəkət etmək, ləng hərəkət etmək; **to ~ in** içəri soxulmaq; *The door burst open and the children barged in Qapı şaqqıltı ilə açıldı və uşaqlar içəri doluşdular / soxuldular*

**bargee** [ba:ˈdʒi:] *n* qayıqçı; barkaçı, barka sahibi; baş fəhlə *(gəmidə)*

**bargeman** [ˈba:dʒmən] *n* *(pl* **-men** [mən]) barja və ya barkada komandanın üzvü

**bargemaster** [ˈba:dʒˌma:stəʳ] *n* barjanın sahibi və ya şkiperi *(ticarət gəmisinin kapitanı)*

**baritone** [ˈbærıtoun] *n mus.* bariton *(basla tenor arasında kişi səsi, bariton səsli adam; musiqi aləti)*

**barium** [ˈbeərıəm] *n kim.* barium *(sarımtıl rəngli yumşaq metal)*

**bark¹** [ba:k] *n* I hürüş, hürmə, it səsi; hürməyə / hürüşə oxşar səs; gurultu; **the ~ of the guns** topların gurultusu;

◊ *His bark is worse than his bite* ≅ *Hürən it dişləməz / qapmaz / tutmaz;*

**bark** [ba:k] *n* II qabıq; **~ of the tree** ağacın qabığı; *He stripped the tree of its bark O, ağacın qabığını soydu;*

◊ **to come / to go between the ~ and a tree** ≅ ətlə dırnaq arasına girmək, başqasının işinə qarışmaq *(xüs. ailə məsələsində)*

**bark²** [ba:k] *v* 1. hürmək; *The dog barks at strangers İt yad adamlara hürür;* 2. gurlamaq *(top haq.)*; *The guns barked Toplar gurladı;* 3. bağırmaq, qışqırmaq; *Don't bark like that, Tom! Tom, belə bağırma / qışqırma!*

◊ **to ~ at the moon** aya hürmək; boş-boş danışmaq

**bark** [ba:k] *v* II 1. qabığını soymaq; **to ~ a tree** ağacın qabığını soymaq; 2. qabıqlamaq, qabıq bağlamaq, qabıqla örtülmək *(ağac haq.)*; 3. dərisi sıyrılmaq; *He barked his knee / elbow O, dizini / dirsəyini sürtüb sıyırdı;*

◊ **to ~ up the wrong tree** ünvanı səhv salmaq; *You're barking up the wrong tree if you ask him to help you, because he never helps anyone Əgər sən/siz ona kömək üçün müraciət etsən/etsəniz, ünvanı səhv salmış olara/olarsınız, çünki o heç vaxt heç kimə kömək etmir*

**bark beetle** [ˈba:k.bi:tl] *n* qabıqyeyən böcək

**barkeeper** [ˈba:ki:pəʳ] *n* 1. bufetçi, bufet qulluqçusu; 2. bufet sahibi; mehmanxana sahibi

**barker** [ˈba:kəʳ] *n* 1. boş-boş hürən it; 2. qışqırıqçı; kobud; 3. auksionist, auksionçu;

◊ **great ~s are no biters** *at. söz.* ≅ *Hürən itlər tutmur/dişləmir; Çılğın adamlar kinsiz olurlar*

**barkery** [ˈba:kərı] *n* dabbaqxana

**barking¹** [ˈba:kıŋ] *n* hürmə, hürüş, it səsi; *The barking kept me awake İt səsi məni yatmağa qoymadı*

**barking²** [ˈba:kıŋ] *adj* 1. hürən; **a ~ dog** hürən it; 2. tutqun, xırıltılı; **a ~ voice** xırıltılı səs;

◊ *A barking dog doesn't bite at. söz. Hürən it dişləməz / tutmaz*

**barky** [ˈba:kı] *adj* 1. qabıqlı; 2. kobud, qaba, sərt, cod

**barley¹** [ˈba:lı] *n* arpa; **peeled ~** qabığı alınmış arpa, arpa yarması; **pearl/ French ~** arpa yarması

**barley²** [ˈba:lı] *adj* arpa; **~ meal** iriüyüdülmüş arpa unu; **~ coffee** arpa kofesi

**barley-bird** [ˈba:lıbə:d] *n zool.* baltadimdik *(balaca oxuyan quş)*

**barley-bree** [ˈba:lıbri:] *n* = **barley-broth**

**barley-broth** [ˈba:lıbrɔθ] *n* bərk arpa pivəsi

**barley-corn** [ˈba:lıkɔ:n] *n* 1. = **barley**; 2. arpa dəni

**barley-milk** [ˈba:lımılk] *n* arpa yarmasından bişirilmiş südlüsıyıq

**barley-stick** [ˈba:lıstık] *n* *(arpadan hazırlanmış)* nabat *(şirniyyat)*



**barley-straw** [ˈba:lıstrɔ:] *n d.d.* cəfəngiyyat, boş / əhəmiyyətsiz şey

**barley-sugar** [ˈba:lı.ʃugəʳ] *n* arpa şəkəri/ qəndi *(nabat)*

**barley-water** [ˈba:lı.wɔ:təʳ] *n* arpa həlimi

**barley-wine** [.ba:lıˈwaın] *n* çox bərk pivə

**barmaid** [ˈba:meıd] *n* 1. bufetçi qadın/qız; 2. barda/pivəxanada işləyən xidmətçi qadın / qız

**barman** [ˈba:mən] *n* *(pl.* **-men** [mən]) 1. bufetçi; bufet sahibi; 2. aşxanaçı, meyxanaçı, aşxana sahibi

**barmy** [ˈba:mı] *adj* 1. köpüklü; qıcqırmış; **~ beer** köpüklü pivə; 2. *d.d.* axmaq, sarsaq; *You must be barmy to say that Sən/Siz gərək axmaq olasan/olasınız ki, bunu deyəsən / deyəsiniz*

**barn** [ba:n] *n* 1. anbar; mərək; taxıl anbarı; malqara saxlanılan yer, ağıl; pəyə, tövlə, mal/inək damı; 2. park *(nəqliyyat vasitələrinin durduğu yer)*, depo, qaraj, **car ~** *amer.* tramvay parkı;

◊ **born in a ~** *amer.* tərbiyəsiz, özünü apara bilməyən; *Are you born in a barn? Meşədə böyümüsən? Meşədən çıxmısan?*

**barn door** [.ba:nˈdɔ:ʳ] *n* anbar qapısı

**barnyard** [ˈba:nˈja:d] *n* 1. anbar, samanlıq; 2. mal-qara saxlanılan yer, ağıl

**barograph** [ˈbærougra:f] *n* baroqraf *(hava təzyiqini avtomatik yazan aparat)*

**barometer** [bəˈrɔmıtəʳ] *n* barometr; *At what height is the barometer? Barometr nə göstərir? The barometer points rain Barometr yağış yağacağını göstərir*

**barometric** [.bærəˈmetrık] *adj* barometrik; **~ pressure** barometrik təzyiq, atmosfer təzyiqi

**barometrical** [.bærəˈmetrıkəl] *adj* = **barometric**

**barometrically** [.bærəˈmetrıkəlı] *adv* barometrə görə, barometr vasitəsilə

**baron** [ˈbærən] *n* 1. baron *(qrafdan kiçik zadəgan rütbəsi)*; 2. **the ~s** *top.i.* lordlar, perlər *(İngiltərədə, Fransada yüksək zadəgan rütbəsi)*; 3. maqnat *(iri kapitalist)*; nüfuzlu adam; əyan, kübar, ağa; **an oil ~** neft maqnatı; **a cattle ~** iri maldar; maldar-maqnat; **coal ~** kömür maqnatı; **soap ~** sabun maqnatı

**baronage** [ˈbærənıdʒ] *n* 1. baronluq, baron rütbəsi; 2. *top.i.* baronlar, lordlar, perlər, aristokratlar, əyyanlar, zadəganlar; feodalların yuxarı təbəqəsi

**baroness** [ˈbærənıs] *n* baronessa *(baronun arvadı)*

**baronet¹** [ˈbærənıt] *n* baronet *(İngiltərədə zadəgan rütbəsi)*

**baronet²** [ˈbærənıt] *v* baronet rütbəsi vermək

**baronetsy** [ˈbærənıtsı] *n* baronet rütbəsi

**baronial** [bəˈrounjəl] *adj* 1. baron; **~ rank** baron rütbəsi; 2. təmtəraqlı, dəbdəbəli, cəlallı, möhtəşəm; qəşəng, gözəl; **a ~ hall** təmtəraqlı/dəbdəbəli/möhtəşəm zal;

◊ **~ mansion 1)** feodal qəsri; 2) dəbdəbəli ev, möhtəşəm saray

**baronism** [ˈbærənızm] *n* ingilis feodalizmi

**barony** [ˈbærənı] *n* 1. baronluq, baron rütbəsi; 2. baron malikanəsi / mülkü; 3. *tar.* feodalın hakimiyyəti altında olan torpaq

**barrack¹** [ˈbærək] *n* *(əsas. pl, lakin tək mənada)* kazarma; barak *(taxtadan tikilmiş müvəqqəti bina)*; *You can't expect me to live in a barrack like that Sən/Siz mənim belə barakda yaşayacağımı güman edə bilməzsən / bilməzsiniz*

**barrack²** [ˈbærək] *adj* kazarma; hərbi; **~ song** əsgər mahnısı; hərbi mahnı; **~ master** *hərb.* hərbi komendant; **~ ship** *dən.* üzən kazarma

**barrack³** [ˈbærək] *v* kazarmada / barakda yerləşdirmək

**barrack-room¹** [ˈbærəkru:m] *n* kazarma, kazarma binası

**barrack-room²** [bærəkru:m] *adj* əsgər; ədəbsiz; nalayiq; **~ language** söyüş, nalayiq sözlər; **~ joke** ədəbsiz/nalayiq zarafat, əsgər zarafatı

**barrage¹** [ˈbærıdʒ, bəˈra:ʒ] *n* 1. çəpər, manеə; 2. bənd; sədd; dəhnə; damba, torpaq bənd; 3. *hərb.* maneə atəşi; **~ of fire** atəş üçün torpaq/səngər; **to deliver / to drop / to lay a ~** atəşə tutmaq

**barrage²** [ˈbæra:ʒ] *v* (**with**) çəpərləmə atəşi açmaq, atəşə tutmaq; *They barraged the speaker with angry questions Onlar natiqi acıqlı suallarla atəşə tutdular*

**barrator** [ˈbærətəʳ] *n* 1. məhkəməbaz; daima məhkəmələrdə dava çəkən adam; böhtançı, fitnəçi, araqarışdıran, dedi-qoduçu; 2. *hüq.* rüşvətxor *(xüs. məhkəmələr haq.)*

**barred** [ba:d] *adj* 1. üstü örtülmüş, bağlanmış; örtülmüş; 2. barmaqlıqla çəpərlənmiş; 3. zolaq-zolaq, zolaqla işarələnmiş, zolaqla nişan vurulmuş

**barrel** [ˈbærəl] *n* 1. çəllək, boçka; **a beer ~** pivə boçkası/çəlləyi; **a ~ of beer** bir boçka/çəllək pivə; 2. çox, bir aləm, bir yığın, hədsiz, hədsizhesabsız, saysız-hesabsız; **a ~ of money** saysız-hesabsız pul; 3. barel *(həcm və tutum ölçüsü)*; 4. *hərb.* lülə *(odlu silahlarda)*; **a gun with two ~s** qoşalülə/ikilüləli tüfəng; 5. *tex.* silindr; baraban *(müxtəlif maşınların və mexanizmlərin silindrşəkilli hissəsi)*

**barrel** [ˈbærəl] *v* 1. boçkalara tökmək; 2. anbarda saxlamaq

**barrel-bellied** [ˈbærəlˈbelıd] *adj* yekəqarın, qarnıyoğun, boçkaqarın

**barrel-bulk** [ˈbærəlbʌlk] *n* böyük/ tutumlu çəllək

**barrel-house** [bærəlhaus] *n* 1. meyxana, içkixana, aşxana; 2. fahişəxana, qəhbəxana

**barrelled** [ˈbærəld] *adj* 1. çəlləyə/boçkaya qablaşdırılmış; 2. çəlləkvarı, boçkavarı, çəlləyəbənzər, boçkayaoxşar

**barrelling** [ˈbærəlıŋ] *n* çəlləklərə/boçkalara qablama

**barrel-organ** ['bærəl.ɔ:gən] *n* şarmanka *(musiqi aləti)*

**barrel-shaped** ['bærəl'ʃeıpt] *adj* çəlləyəoxşar, çəlləyəbənzər, çəlləkvarı, boçkavarı

**barren¹** ['bærən] *n* **1.** boş yer, xam yer; **2.** *amer.* kol-kosla örtülmüş yamac/düzənlik

**barren²** ['bærən] *adj* **1.** qısır, doğmayan; bala verməyən *(heyvan haq.)*; **2.** qeyri-məhsuldar, məhsul verməyən, münbit olmayan *(torpaq haq.)*; ~ **land/soil** qeyri-məhsuldar / məhsul verməyən torpaq; **3.** sonsuz, doğmayan, uşağı olmayan; ~ **woman** doğmayan / uşağı olmayan arvad / qadın; ~ **marriage** uşaqsız/sonsuz ailə; **4.** *bot.* barsız, bar verməyən, bar gətirməyən; toxumsuz, toxum verməyən, toxumlamayan; ~ **trees** barsız/bar verməyən/bar gətirməyən ağaclar; **5.** dölsüz, döl verməyən; **6.** kasıb, yoxsul; məhrum; ~ **of ideas** düşüncədən / mülahizədən kasıb; ~ **of imagination/ of creative spirit** təxəyyüldən/ yaradıcılıq ruhundan məhrum; ~ **of interest** maraqsız, cansıxıcı; *Though she was beautiful, she was completely barren of charm Baxmayaraq ki, o gözəl idi, onun qətiyyən cazibədarlığı yox idi;* **hearts ~ of kindness** mərhəmətsiz/rəhmsiz ürək; **7.** boş, mənasız; ~ **scheme** boş /mənasız təşəbbüs/ niyyət; ~ **praise** boş tərif; ~ **life** mənasız həyat / ömür; ~ **style** quru/kasıb dil/üslub; **8.** laqeyd, maraqsız; ~ **spectators** laqeyd tamaşaçılar; **9.** faydasız, tərkibində faydalı qazıntı olmayan *(filiz haq.)*; ~ **rock** tərkibində faydalı qazıntı olmayan süxur; ~ **sand** faydasız qum; ~ **well** faydasız/səmərəsiz quyu;

◊ ~ **fig-tree 1)** uşaqsız / sonsuz qadın; **2)** məğmun / ümidi boşa çıxan adam

**barrener** ['bærənəʳ] *n* qısır/doğmayan inək

**barricade¹** [.bærı'keıd] *n* **1.** barrikada *(küçə səngəri)*; **2.** *məc.* sədd, çəpər; maneə, əngəl

**barricade²** [.bærı'keıd] *v* **1.** barrikada qurmaq; *Streets were barricaded Küçələrdə barrikada qurulmuşdu;* **2. (from, against)** qorumaq, mühafizə etmək *(özünü bir kəsdən / bir şeydən)*

**barrier¹** ['bærıəʳ] *n* **1.** çəpər, alçaq divar; sürahı, məhəccər, barmaqlıq; *The police put up barriers to control the crowd Kütləyə nəzarət etmək üçün polis çəpər çəkdi; High mountains and deserts have always been a barrier to the movements of people Hündür dağlar və səhralar həmişə insanlar /adamlar üçün maneə olub;* **2.** zastava, qarovulxana; şlaqbaum; *The watchman drew up the barrier and let the car pass Keşikçi/ Gözətçi şlaqbaumu qaldırdı və maşının keçməsinə icazə verdi; Custom duty was collected at the barrier Gömrük haqqı qarovulxanada yığıldı;* **3.** *id.* maneə; **4.** *hərb.* maneə; **5.** *məc.* əngəl, çətinlik; maneə; **trade ~s** ticarət çətinlikləri; *Poor health may be a barrier to education Zəif sağlamlıq təhsil almağa maneə ola bilər;* **6.** *(təbii)* sərhəd, təbii maneə; *The mountains formed a natural barrier against the cold winds Dağlar soyuq küləklərə qarşı təbii maneədir / çəpərdir*

**barrier²** ['bærıəʳ] *adj* mühafizə, maneə; ~ **works** müdafiə tikililəri; ~ **light** maneə projektoru

**barrier³** ['bærıəʳ] *v* ətrafına çəpər çəkmək, ətrafını çəpərləmək, məhəccərlə dövrələmək, dövrəsinə məhəccər çəkmək

**barring** ['ba:rıŋ] *prep* başqa, ... savayı, çıxmaqla, müstəsna / istisna olmaqla; çıxmaq şərtilə; *The whole group was at the party, barring John Condan başqa bütün qrup qonaqlıqda idi;* ~ **accidents** bədbəxt hadisələr istisna / müstəsna olmaqla

**barrister** ['bærıstəʳ] *n ali məhkəmədə danışmaq və mübahisə etmək / açmaq ixtiyarı olan vəkil (xüs. İngiltərədə)*

**barrow** ['bærou] *n* I **1.** təpə, təpəlik; alçaq dağ; **2.** kurqan *(qədim qəbirlər üzərində təpə)*

**barrow¹** ['bærou] *n* II **1.** əlarabası; **powered ~** özüyeriyən/motorlu əlarabası; **2.** xərək

**barrow²** [bærou] *v* əlarabası ilə daşımaq

**barrow boy** ['bærou.bɔı] *n* əlarabasında şey-satan oğlan

**Bart** [ba:t] *n* **baronet** *isminin qısa forması*

**bartender** ['ba:.tendəʳ] *n* **1.** bufetçi, bufet sahibi; **2.** aşxanaçı, aşxana sahibi

**barter¹** [ba:təʳ] *n* dəyişdirmə, dəyişmə, əvəz etmə, mübadilə ticarəti

**barter²** [ba:təʳ] *v* dəyişdirmək, dəyişmək; mübadilə / ticarət etmək; **to ~ ware for ware** əmtəə mübadiləsi etmək, malı mala dəyişmək; **to ~ wheat for machinery** buğdanı dəzgaha dəyişmək

**barter's itch** ['ba:təzıtʃ] *n bayt.* qotur

**barton** ['ba:tn] *n* **1.** mülk, həyət; təsərrüfat; **2.** *k.t.* toyuq hini, quş damı, quşxana

**basalt** ['bæsɔ:lt] *n miner.* bazalt *(tünd rəngli çox bərk vulkanik süxur)*

**base¹** [beıs] *n* **1.** əsas, özül, bünövrə, təməl; **the ~ of the great pyramids** böyük piramidaların özülü/əsası; ~ **of the skull** *anat.* beyin sümüyünün əsası/bünövrəsi; **the ~ of a building** binanın özülü/bünövrəsi/təməli; **the ~ of a mountain** dağın dibi; **2.** baza; **air ~** hərbi-hava bazası, **military ~** hərbi baza; **supply ~** təminat bazası; **3.** *riyaz.* oturacaq *(həndəsi fiqurda)*; **4.** *dilç.* əsas *(sözdə)*; **5.** *id.* start yeri, start meydanı

**base²** [beıs] *adj* **(-r, -st) 1.** alçaq, rəzil; ~ **act** alçaq hərəkət; ~ **man** alçaq/rəzil/əclaf adam; **2.** alçaq, yavaş, aşağı; ~ **sound** alçaq/ yavaş səs; **3.** saxta *(sikkə haq.)*; **4.** paslanan, oksidləşən *(metallar haq.)*; **5.** sadə, adi (adam haq.); vulqar, loru *(dil haq.)*; ~ **Latin** vulqar/ loru latın dili; ~ **language** loru /vulqar dil; kobud /ədəbsiz ifadələr; **6.** baza; əsas; ~ **camp 1)** baza/ əsas düşərgə; *(alpinistlər üçün)*; **2)** mərkəzi / əsas qəsəbə *(meşə qoruyanlar və s. üçün)*; ~ **depot** *hərb.* əsas anbar, baza anbarı; ~ **area** *hərb.* əsas yerləşmə ərazisi; ~ **hospital** *hərb.* mərkəzi /əsas qospital *(hərbi xəstəxana)*; **7.** *arx.* qeyri-qanuni, qeyri-qanuni doğulmuş; ~ **son/girl** qeyri-qanuni doğulmuş oğul / qız

**base³** [beıs] *v* **1. (on, upon)** əsaslanmaq; *These conclusions are based on facts Bu nəticələr faktlara əsaslanır;* **2.** əsasını/binasını qoymaq; **3.** ordu yerləşdirmək; **4.** yerləşmək, baza yaratmaq; *Where is your company based? Sizin şirkət harada yerləşir?*

**base-ball** [beısbɔ:l] *n id.* **1.** beysbol *(oyun növü)*; **2.** beysbol topu

**baseboard** ['beısbɔ:d] *n inş.* döşəmə yaşmağı, haşiyə

**base-born** ['beısbɔ:n] *adj* **1.** rəiyyət, aşağı silkdən olan; **2.** alçaq, yaramaz; əclaf, mənfur, rəzil; ~ **cad** alçaq/yaramaz/ rəzil adam; **3.** qeyri-qanuni doğulmuş; əsli-nəcabəti olmayan, rəiyyət ailəsində doğulmuş; *Although base-born, he became rich Rəiyyət ailəsində doğulmasına baxmayaraq, o varlandı*

**baseless** ['beıslıs] *adj* əsassız, boş, əsası olmayan; ~ **fear/rumours/gossip** əsassız qorxu/şayiələr /qeybət; *The charges made against the boy by the police were found to be baseless, so he was freed Polis tərəfindən oğlana qarşı qaldırılmış ittihamın əsassız olduğu aydınlaşdı və onu azad etdilər*

**baselessness** ['beıslısnıs] *n* əsassızlıq, dəlilsizlik, sübutsuzluq; *The baselessness of the statement was evident Bəyanatın əsassızlığı aydın idi*

**baseline** ['beıslaın] *n* **1.** əsas, bazis, əsas xətt; **2.** *id.* meydanın arxa xətti

**basely** ['beıslı] *adv* alçaqcasına; namərdcəsinə, əclafcasına; abırsızlıqla

**basement** ['beısmənt] *n* **1.** əsas, özül; təməl, bünövrə; **2.** zirzəmi; yarımzirzəmi mərtəbə / qat; *She lives in a basement O, zirzəmidə yaşayır*

**base metal** [.beıs'metl] *n* paslanan metallar *(dəmir, qurğuşun və s.)*

**baseness** ['beısnıs] *n* **1.** alçaqlıq, rəzillik, rəzalət, əclaflıq; **2.** paslanmağa meyllilik

**bases** ['beısız] **basis** *isminin cəm forması*

**bash¹** [bæʃ] *n* güclü/ağır zərbə; *He gave the boy a bash on the nose O, oğlanın burnuna ağır zərbə endirdi*

**bash²** [bæʃ] *v* vurmaq, güclü zərbə endirmək; çırpmaq, itələmək *(qapını və s.)*;

◊ **to ~ one's head against a stone wall** başını daş divara vurmaq; *He bashed the door in and entered the room O, qapını içəri itələdi və otağa girdi*

**bashaw** [bə'ʃɔ:] *n* türk paşası

**bashful** ['bæʃfl] *adj* utancaq, həyalı; qorxaq, ürəksiz, cəsarətsiz, ağciyər; təvazökar, sakit, dinc; ~ **young girl** utancaq gənc qız; ~ **child** qorxaq / ağciyər uşaq; ~ **looks** təvazökar görkəm; ~ **glance** utancaq / həyalı baxış

**bashfully** ['bæʃfəlı] *adv* **1.** utancaq bir tərzdə, utana-utana, həyalı; **to smile ~** utana-utana gülümsəmək; **2.** qorxaqcasına, qorxa-qorxa; sakitcə, sakit-sakit

**bashfulness** ['bæʃfulnıs] *n* **1.** utancaqlıq, həyalılıq, qorxaqlıq, cəsarətsizlik; **2.** təvazökarlıq; sakitlik

**basic** ['beısık] *adj* **1.** əsas, başlıca, ən vacib /zəruri; ~ **principles** əsas prinsiplər; ~ **fact** əsas/ən vacib fakt; ~ **argument** əsas /başlıca mülahizə; ~ **issues** əsas/başlıca/ ən vacib məsələlər; ~ **wage/pay** əsas əməkhaqqı; ~ **commodities** əsas / başlıca mallar; ~ **industry 1)** sənayenin əsas sahəsi; **2)** ağır sənaye; ~ **research** nəzəri tədqiqat, elmin əsas problemlərini əhatə edən tədqiqat işi; **2.** elementar; ən sadə; sadələşdirilmiş; **Basic English** Besik İnqliş *(Ç. Oqden tərəfindən təqdim edilmiş və 850 sözdən ibarət elementar ingilis dili və onun öyrədilməsi üsulu)*

**basically** ['beısıkəlı] *adv* əsasən, əsas etibarı ilə, mahiyyətcə; *Basically, he is a nice person Əsasən o, yaxşı adamdır*

**basil** ['bæzıl] *n* I *bot.* reyhan

**basil** ['bæzıl] *n* II aşılanmış qoyun dərisi

**basilica** [bə'zılıkə] *n* *mem.* bazilika *(antik dövrdə və orta əsrdə: içərisi sütunlarla iki hissəyə bölünən böyük bina)*

**basin** ['beısn] *n* **1.** kasa; tas, ləyən; teşt; cam; **earthenware ~** saxsı kasa/cam; **copper ~** mis tas/ləyən; **2.** rezervuar, hovuz, göl, nohur; **the ~ of a fountain** fəvvarənin nohuru/gölü; **3.** hövzə; **The Thames ~** Temzanın hövzəsi; **4.** *geol.* süxur laylarının sahəsi; yataq; **5.** kiçik buxta *(kiçik körfəz)*; ~ **dock** buxta hövzəsi

**basinful** ['beısnful] *n* **1.** camdolusu, ləyəndolusu; **a ~ of gruel** camdolusu sıyıq; **2.** *d.d.* çox, bir aləm; hədsiz, saysız-hesabsız; **a ~ of work** çox/ bir aləm iş; ~ **of trouble** çoxlu/bir yığın dərd; **a ~ of excitement** çoxlu həyəcan / narahatlıq

**basin-hat** ['beısnhæt] *n hərb. d.d.* dəmir papaq, şlem, dəbilqə

**basis** ['beısıs] *n (pl* **bases) 1.** bazis; əsas; ~ **and superstructure** bazis və üstqurum; **on the ~ of peaceful co-existence** dinc yanaşı yaşama şəraitində; **on this ~** bu əsasda; bundan çıxış edərək, buna əsaslanaraq; *What is the basis of your opinion? Sənin/Sizin mülahizənin / mülahizənizin əsasında nə dayanır?;* **2.** əsas komponent /hissə, əsas; *The basis of this beverage is milk Bu içkinin əsasını süd təşkil edir. Bu içki süddən hazırlanır;* **3.** özül; *This tower stood on a solid basis Bu qüllə möhkəm özül üstündə dayanıb;* **4.** *hərb.* baza

**bask** ['ba:sk] *v* **1.** qızınmaq; qızdırılmaq; istidən həzz almaq/xumarlanmaq; **to ~ in the sun** günəş altında qızınmaq/xumarlanmaq; **2.** *məc.* həzz almaq; nəşələnmək, zövq/ləzzət almaq; **to ~ in fame** şöhrətdən ləzzət/həzz almaq/nəşələnmək

**basket[1]** ['ba:skɪt] *n* 1. səbət; **clothes ~** paltar səbəti; **waste-paper ~** işlənmiş kağız üçün səbət; zibil səbəti; **a ~ of apple** bir səbət alma; **a ~ of fish** bir səbət balıq; 2. basketbol oyununda səbət; basketbol oyununda topu səbətə salma; ◊ **the pick of the ~** seçmə, ən yaxşı; **to be left in the ~** kənarda qalmaq, əli heç nəyə çatmamaq; **to give *smb.* the ~** elçiyə inkar cavab vermək, elçinin təklifini rədd etmək

**basket[2]** [ba:skɪt] *v* 1. səbətə yığmaq / qoymaq; 2. zibil səbətinə atmaq / tullamaq

**basket-ball** ['ba:skɪtbɔ:l] *n id.* 1. basketbol *(oyun)*; 2. basketbol topu

**basketballer** ['ba:skɪt.bɔ:lər] *n* basketbolçu, basketbolist

**basketful** [ba:skɪtful] *n* səbətdolusu; **two ~s of apples** iki səbət(dolusu) alma

**basketing** ['ba:skɪtɪŋ] *n* səbəthörmə

**basket-oiser** ['ba:skɪt.ouʒər] *n* = **basket-willow**

**basketry** [ba:skɪtrɪ] *n* 1. səbəthörmə, səbəttoxuma, səbətçilik; 2. bir-birinə dolaşma *(ağacın budaqları haq.)*

**basket-willow** ['ba:skɪt'wɪlou] *n bot.* səbət hörmək üçün söyüd

**basket-work** [ba:skɪtwə:k] *n* 1. hörmə, səbətçilik məmulatı; 2. rişelye *(naxışlı tikmə)*

**basking-shark** ['ba:skɪŋʃa:k] *n zool.* nəhəng köpək balığı

**Basque[1]** [bæsk] *n* 1. bask *(xalq)*; 2. bask dili

**Basque[2]** [bæsk] *adj* bask, basklara aid olan; **the ~ language** bask dili

**bas-relief** ['bæsrɪ.lɪ:f] *n* barelyef, qabartma, qabartma naxışı *(bəzək)*

**bass[1]** [bæs] *n* I *zool.* xanı balığı

**bass** [bæs] *n* II bass *(pivə növü)*

**bass** [bæs] *n* III ağac qabığından düzəldilmiş lif

**bass** [beɪs] *n* IV *mus.* 1. bas; 2. bas səsə malik adam / kişi

**bass[2]** [beɪs] *adj* bas; alçaq; **~ clef** bas açarı; **~ voice** bas səs; *He has a fine bass voice Onun gözəl bas səsi var*

**bass clarinet** ['beɪs.klærɪ'net] *n* bas-klarnet

**basset** ['bæsɪt] *n* taska *(it cinsi)*

**bassinet** ['bæsɪ'net] *n* 1. hörmə uşaq arabası; 2. çağa üçün çöpdən hörülmüş beşik / çarpayı

**bassoon** [bə'su:n] *n mus.* faqot *(nəfəsli musiqi aləti)*

**bassoonist** [bə'su:nɪst] *n* faqot çalan, faqotist

**bass-viol** ['beɪs.vaɪəl] *n mus.* 1. violonçel; 2. kontrabas *(iri skripkayaoxşar musiqi aləti)*

**bass-wood** ['bæswud] *n* Amerika cökəsi *(ağac növü)*

**bast[1]** [bæst] *n* 1. ağac lığı, alt qabıq, lif; 2. çətənə, kətan; cökə ağacından soyulub, həsir toxumaq üçün işlədilən alt qabıq

**bast[2]** [bæst] *adj* cökə lifindən toxunmuş; **~ mats /matting** həsir *(cökə lifindən hörülmüş)*; **~ shoes** çarıq *(ağac lifindən hörülmüş)*

**bastard[1]** ['bæstəd] *n* 1. kəbinsiz doğulmuş / zinadan əmələ gəlmiş uşaq; 2. *kob.* düdəmə; bədzad, haramzada; 3. *bot.* mələz; metis; 4. bastr *(sarı rəngli şəkər tozu)*

**bastard[2]** ['bæstəd] *adj* 1. kəbinsiz, qanunsuz, qeyri-qanuni, bic; kəbinsiz doğulmuş; 2. aşağı keyfiyyətli, keyfiyyətsiz; **~ diamonds** aşağı keyfiyyətli almaz; **to speak ~ French** pozuq fransız dilində danışmaq; 3. qarışıq, müxtəlif, yekcins olmayan; **~ type** *poliq.* qarışıq/yekcins olmayan şrift; 4. süni, saxta, qəlp; yalançı, riyakar; uydurma, **~ good nature** yalançı / süni / saxta həlimlik; **~ charity** yalançı / süni mərhəmət; **~ patriotism** saxta / süni / yalançı vətənpərvərlik

**bastardize, -ise** ['bæstədaɪz] *v* 1. uşağın qeyri-qanuni doğulmasını sübut etmək; 2. xarab etmək, korlamaq, pisləşdirmək; **to ~ the language** dili korlamaq, pozuq dildə danışmaq; 3. nəsli pozulmaq, cırlaşmaq, əslini itirmək, pisləşmək

**bastardy** ['bæstədɪ] *n* 1. kəbinsiz doğulma; kəbinsizlik; qeyri-qanuni doğulma; 2. əxlaqsızlıq, əxlaq pozğunluğu

**baste** [beɪst] *v* I köklənmək, kök atmaq, sırımaq, bəndləmək;
◊ **to ~ up a story** hekayə uydurmaq/qondarmaq

**baste** [beɪst] *v* II 1. kötəkləmək, əzişdirmək; qırmanclamaq, ağacla döymək; 2. *mac.* tənqid etmək; sual yağdırmaq, istehza/rişxənd etmək, masqaraya/lağa qoymaq

**bastel-house** ['bæstlhaus] *n* istehkam vəziyyətinə salınmış / möhkəm mühafizə edilmiş ev / məskən; ev-qala

**bastille** [bæs'tɪ:l] *n* 1. qala; istehkam; 2. qala-həbsxana; **the Bastille** Bastiliya; **Bastille day** Bastiliyanın alınması günü *(fransızların milli bayramı)*

**bastinado[1]** [.bæstɪ'neɪdou] *n (pl* **-os** [-ouz]) 1. ağacla/dəyənəklə vurulan zərbə; 2. dabana döymə *(bəzi şərq ölkələrində cəza növü)*; 3. ağac, dəyənək

**bastinado[2]** [.bæstɪ'neɪdou] *v* 1. ağacla dabana döymək; 2. dəyənəklə əzişdirmək/döymək, kötəkləmək

**bastion** ['bæstɪən] *n hərb.* istehkam; möhkəm dayaq; **a ~ of peace/freedom** sülhün / azadlığın möhkəm dayağı

**bat[1]** [bæt] *n* I 1. *zool.* yarasa; 2. deyingən arvad;
◊ **as blind as a ~** yarasa kimi kor, tamam kor; **to be ~s** ağlı başında olmamaq, ağlı başından çıxmaq, ağlını itirmək; **to go like a ~ out of hell** ≅ dəli kimi qaçmaq, var gücü ilə qaçıb canını qurtarmaq

**bat** [bæt] *n* II 1. dəyənək, ağac; 2. lapta, toxmaq *(iki dəstə ilə oynanılan top oyununda işlədilən)*; 3. *d.d.* zərbə; 4. *d.d.* addım, sürət, temp; **at a good ~** cəld, sürətlə, yaxşı templə; **to go full ~** var gücü ilə təqib etmək / arxasınca qaçmaq;
◊ **to be at ~** əsas/başlıca rol oynamaq; **right off the ~** dərhal, o saat; *The news came right off the bat Xəbər dərhal gəldi / çatdı*



**bat[2]** [bæt] *v (-tt-)* I 1. kötəkləmək, dəyənəklə döymək; 2. *id.* lapta ilə/toxmaqla topa vurmaq; topu oyuna daxil etmək; *Who is batting now? İndi topu oyuna kim daxil edəcək? (voleybol oyununda)*

**bat** [bæt] *v (-tt-)* II 1. gözlərini döymək; göz qırpmaq, kirpik çalmaq; göz vurmaq, göz eləmək; 2. çalmaq *(qanad)*;
◊ **not to ~ an eye,** gözlərini qırpmamaq; **without batting an eyelid** heç bir reaksiya verməədən; *He heard the news without batting an eyelid O, xəbəri gözlərini qırpmadan/çox sakit qarşıladı*

**bat-blind** ['bætblaɪnd] *adj* kor, koruş

**batch** [bætʃ] *n* I 1. bir dəfəyə bişirilən çörək; bişirilmiş çörək; 2. kiçik yığın, partiya; kiçik qalaq; balaca dəstə; paçka, bağlı; **a ~ of books / letters / documents** bir paçka kitab / məktub / sənəd; **a ~ of eggs** yumurta qoyma *(həşəratlar haq.)*; **a ~ of goods** bir partiya mal; 3. qrup, dəstə; **a ~ of visitors** bir dəstə qonaq

**batch** [bætʃ] *n* II *d.d.* subay kişi

**bate** [beɪt] *v* 1. azaltmaq, əskiltmək; aşağı salmaq; **to ~ expense** xərci azaltmaq; **to ~ demands** tələbi azaltmaq; 2. korşaltmaq, kütləşdirmək; **to ~ the edge of a sword** qılıncı korşaltmaq; 3. zəifləmək, sönmək; arıqlamaq, sınıxmaq; *Hope bated day by day Ümid günbəgün sönürdü;*
◊ **to ~ *smb.'s* pride** bir kəsin mənliyini alçaltmaq

**bated** ['beɪtɪd] *adj* saxlanılan, qarşısı alınan; **with ~ breath** nəfəs almadan, nəfəsini içinə çəkərək

**bath[1]** [ba:θ] *n (pl* **baths** [ba:ðz]) 1. çimmə *(hamamda, vannada)*; yuyunma; **to have /to take a ~** çimmək, vanna qəbul etmək, yuyunmaq; **shower ~** duş; 2. vanna; vanna otağı; **two bedrooms, kitchen and ~** iki yataq otağı, mətbəx və vanna otağı

**bath[2]** [ba:θ] *v* 1. çimdirmək; **to ~ the baby** uşağı çimdirmək; *He is bathing the baby O, uşağı çimdirir;* 2. çimmək, yuyunmaq *(vannada)*; *He can't see you now; he is bathing O indi sizi qəbul edə bilməz, o çimir*

**bath-chair** ['ba:θtʃeər] *n* xəstələr üçün təkərli kreslo

**bathe[1]** [beɪð] *n* çimmə *(çayda, dənizdə)*; **to have a ~** çimmək, yuyunmaq; *Let's go for a bathe today Gəlin bu gün çimməyə gedək*

**bathe[2]** [beɪð] *v* 1. yumaq; **to ~ *one's* eyes / face/feet, *etc.*** gözlərini/üzünü/ayaqlarını *və s.* yumaq; *The doctor told him to bathe his eyes twice a day Həkim ona dedi ki, gözlərini gündə iki dəfə yusun; The Mediterranean Sea bathes the sunny shores of Italy Aralıq dənizi İtaliyanın günəşli sahillərini yuyur;* 2. çimmək; *I like to bathe in the sea Mən dənizdə çimməyi sevirəm*

**bather** ['beɪðər] *n* çimən *(kişi, qadın və s.)*, çimməyi sevən adam

**bathhouse** ['ba:θhaus] *n* 1. hamam; 2. dəniz/çay hamamı; 3. soyunma-geyinmə yeri *(çimərlikdə)*

**bathing[1]** ['beɪðɪŋ] *n* çimmə; *Mixed bathing (by men and women) is allowed in this swimming pool Bu üzgüçülük hovuzunda qatışıq (kişi və qadınlar birgə) çimməyə icazə verilir*

**bathing[2]** ['beɪðɪŋ] *adj:* **~ costumes/suits/ caps** çimmək üçün kostyum/papaq; **~ beach** çimərlik

**bathing-beauties** ['beɪðɪŋ'bju:tɪz] *n amer.* çimərlik paltarında olan gözəl qızlar *(tamaşa və gözəllik müsabiqəsində və s.)*

**bathing-place** ['beɪðɪŋpleɪs] *n* dəniz kurortu

**bathrobe** ['ba:θroub] *n* çimmək üçün xalat

**bathroom** ['ba:θru:m] *n* 1. vanna otağı; 2. *tab.* ayaqyolu; *Is there a bathroom in this restaurant? Bu restoranda ayaqyolu varmı?*

**baths** [ba:ðz, ba:θz, bæθs] *n* hamam; **the public ~** ictimai hamam

**bath-side** ['ba:θsaɪd] *n* hovuzun bortu *(kənarı)*

**bath-towel** ['ba:θ.tauəl] *n* hamam məhrəbası, böyük ölçülü tüklü dəsmal

**battalion** [bə'tæljən] *n* 1. *hərb.* batalyon; *amer.* artilleriya divizionu; 2. *arx.* qoşun; ordu; **~ group** gücləndirilmiş batalyon; **~ commander** batalyon komandiri

**battery** [bə'trɪ] *n* 1. *hərb.* batareya *(bir neçə top və ya minaatandan ibarət hərbi hissə)*; **to bring a ~ into action** topları işə salmaq; 2. *tex.* batareya *(bir-birinə birləşdirilmiş bir neçə elektrik elementi və ya akkumulyator sırası)*; 3. dəst: **a ~ of pots / knives** bir dəst qazan / bıçaq; *She had a battery of cooking pots in her kitchen Onun mətbəxində bir dəst qazanı vardı*

**battle[1]** ['bætl] *n* 1. döyüş, vuruş, savaş, dava, vuruşma; **the Battle of Waterloo** Vaterlo döyüşü/vuruşu; **~ of Stalingrad** Stalinqrad döyüşü / vuruşu; **~ of Borodina** Borodino döyüşü/vuruşu; **~ of Chaldran** Çaldıran döyüşü/vuruşu; **to fight a battle** vuruşmaq, döyüşmək, çarpışmaq; **to offer ~** döyüşə/vuruşa vadar etmək; döyüşə/ vuruşa çağırmaq; **line of ~** cəbhə xətti; hərbi cərgə; **to give ~** vuruşmaq; **to join ~** döyüşə/vuruşa/davaya qoşulmaq/girişmək; **killed in ~** döyüşdə/vuruşda həlak olmuş; **to refuse ~** döyüşdən/vuruşdan / savaşdan/vuruşmadan imtina etmək; **Battle of Britain** *tar.* "İngiltərə uğrunda döyüş; 2. mübarizə; **the ~ of life** həyat/yaşamaq uğrunda mübarizə; **losing ~** ümidsiz/sonu olmayan mübarizə; **to fight *one's* ~** öz inamı/marağı uğrunda mübarizə aparmaq; **a ~ of wits** ağılların mübarizəsi; hazırcavablıqda yarışma; 3. qələbə; *In life the battle is not always to the strong, but often to the person who works hardest Həyatda qələbə həmişə güclülərin tərəfində deyil, inadkarlıqla işləyən adamların tərəfində olur*

**battle**[2] [ˈbætl] *adj* döyüş, vuruş; dava, savaş; ~ **scene** döyüş/vuruş/dava/savaş səhnəsi; ~ **area** cəbhə rayonu; vuruş/müharibə meydanı; ~ **line** cəbhə xətti; ~ **losses** döyüşdə verilmiş itkilər; ~ **casualties** döyüşdə verilən itkilər; ~ **service** nizami orduda xidmət; ~ **cruiser** xətt gəmisi *(mükəmməl silahlanmış iri hərb gəmisi)*; ~ **dress** döyüş geyimi/paltarı; ~ **map** taktiki xəritə;
◊ **half the** ~ nailiyyətin/müvəffəqiyyətin rəhni; **to fight** *smb.'s* **~s for him** bir kəsə görə davaya girişmək, bir kəsin əvəzinə vuruşmaq; *The battle is to the strong Güclülər qalib gəlirlər, Qələbə güclülərin tərəfində olur*

**battle**[3] [ˈbætl] *v* **1.** vuruşmaq, döyüşmək, dava etmək; **to ~ against the wind** küləyə qarşı getmək; **2.** mübarizə aparmaq; **to ~ for the title of champion** çempion adı uğrunda mübarizə aparmaq

**battle-axe** [ˈbætlæks] *n* **1.** *arx.* təbərzin; **2.** *tar.* döyüşdə / vuruşda silah kimi istifadə edilən uzun saplı balta

**battle-cry** [ˈbætlkraı] *n* **1.** hərbi müraciət / çağırış; **2.** hərbi şüar

**battle-field**[1] [ˈbætlfi:ld] *n* döyüş/vuruş meydanı; **face of the** ~ döyüş/vuruş mənzərəsi; döyüş / vuruş lövhəsi; döyüş / vuruş səhnəsini əks etdirən lövhə

**battle-field**[2] [ˈbætlfi:ld] *adj*: ~ **atomic weapon** *hərb.* taktiki atom silahı; ~ **illumination** *hərb.* döyüş meydanında hədəfləri işıqlandırma

**battle-grey** [ˈbætlgreı] *adj* müdafiə rəngi *(əsgərlərin geyindiyi paltarın rəngi)*

**battle-ground** [ˈbætlgraund] *n* **1.** = **battle-field**; **2.** hərbi əməliyyat/müharibə meydanı

**battlements** [ˈbætlmənts] *n* **1.** qala bacası olan hasar; diş-diş divar; **2.** *hərb.* sipər

**battle-order** [ˈbætlˈɔ:dəʳ] *n* **1.** hərbi intizam / nizam; **2.** hərbi əmr; **3.** yürüş forması

**battle-plane** [ˈbætlpleın] *n* hərbi təyyarə, döyüş təyyarəsi

**battleship** [ˈbætlʃıp] *n dən.* xətt gəmisi *(mükəmməl silahlanmış iri hərb gəmisi)*, hərb gəmisi

**battle-tested** [ˈbætlˈtestıd] *adj hərb.* döyüşdə sınaqdan çıxmış, hərbi/döyüş təcrübəsi olan; bərkdən-boşdan çıxmış, oddan-alovdan keçmiş

**battle-tried** [ˈbætltraıd] *adj* = **battle-tested**

**battle-worthy** [ˈbætl.wə:ðı] *adj hərb.* döyüş qabiliyyəti/bacarığı olan, döyüşə qabil / yararlı

**battology** [bəˈtɔlədʒı] *n* eyni sözü yersiz təkrar etmə; tavtologiya; boşboğazlıq, naqqallıq, lağlağılıq

**batty** [ˈbætı] *adj* (**-ier, -iest**) **1.** ağlını itirmiş; ağlı başından çıxmış; *She is quite batty O, tamamilə ağlını itirib;* **2.** yarasayaoxşar, yarasayabənzər, yarasa kimi

**bauble** [ˈbɔ:bl] *n* **1.** *(ucuz)* bəzək-düzək, oyun-oyuncaq; şax-şax, çax-çax *(oyuncaq)*; **2.** *məc.* boş şey, dəyərsiz şey; **3.** oyuncaq, oyun-oyuncaq; *Wealth and social position are only baubles; we cannot take them with us when we die Var-dövlət və vəzifə ancaq oyun-oyuncaqdır; öləndə biz onları özümüzlə apara bilmirik*

**bawd**[1] [bɔ:d] *n* **1.** aradüzəldən qadın, fahişəxana sahibəsi; **2.** fahişə

**bawd**[2] [bɔ:d] *v* ara düzəltmək, oğraşlıq etmək

**bawdily** [ˈbɔ:dılı] *adv* ədəbsiz, ədəbsizcəsinə, həyasız, həyasızcasına; **to behave** ~ ədəbsiz hərəkət etmək

**bawdiness** [ˈbɔ:dınıs] *n* ədəbsizlik, həyasızlıq, abırsızlıq

**bawdry** [ˈbɔ:drı] *n* **1.** ədəbsizlik, həyasızlıq; ədəbsiz söhbətlər / hərəkətlər, söyüş; **2.** aradüzəltmə, oğraşlıq

**bawdy** [ˈbɔ:dı] *adj* ədəbsiz, həyasız, utanmaz, yaramaz, nalayiq; çirkin *(lətifə və s. haq.)*; ~ **jokes** ədəbsiz / nalayiq zarafatlar

**bawdy-house** [ˈbɔ:dıhaus] *n d.d.* fahişəxana, qəhbəxana

**bawl**[1] [bɔ:l] *n* fəryad, nalə, fəğan, şivən, inilti; qışqırıq, çığırtı; ucadan ağlama; hıçqıraraq ağlama

**bawl**[2] [bɔ:l] *v* qışqırmaq, çığırmaq, bağırmaq; fəryad/fəğan etmək; ucadan ağlamaq, hönkürmək; *The child was bawling all night Uşaq bütün gecəni qışqırırdı / qışqırıb;* **to ~ at** *smb.* bir kəsin üstünə qışqırmaq; *He bawled at me O mənim üstümə qışqırdı;* **to ~ across the street** küçənin bu tərəfindən o tərəfinə qışqırmaq; **to ~ about the house** qışqırtısı / bağırtısı / fəryadı evi başına götürmək; *Don't bawl like that: I can hear you well Belə bağırma/bağırmayın, mən səni / sizi yaxşı eşidirəm;* **to ~ oneself hoarse** səsi batana kimi qışqırmaq / bağırmaq; **to ~ against** uca səslə etiraz etmək; **to ~ out** qışqırmaq, bağırmaq, çığırmaq; **to ~ out abuse** ucadan söymək; **to ~ out for** *smth.* bir şeyi uca səslə tələb etmək; **to ~** *smb.* **out** bir kəsin üstünə qışqırmaq / çığırmaq / bağırmaq

**bawler** [ˈbɔ:ləʳ] *n kob.* qışqırıqçı, çığıran; bağıran / çığıran adam

**bay**[1] [beı] *n* I kürən at

**bay** [beı] *n* II **1.** hürüş, hürmə, it səsi; **2.** qovulub əldən salınmış heyvanın vəziyyəti; **3.** *məc.* çıxılmaz vəziyyət; **an animal at ~** qovularaq çıxılmaz vəziyyətə salınmış vəhşi heyvan; **to be/to stand at** ~ çıxılmaz vəziyyətdə qalmaq/olmaq; **to turn to** ~ var qüvvəsilə/gücü ilə müdafiə olunmaq; **to bring/to drive to** ~ **1)** qovub əldən salmaq *(vəhşi/yırtıcı heyvan haq.)*; **2)** divara dirəmək, çətin /çıxılmaz vəziyyətə salmaq; **3)** sıxışdırmaq *(düşməni)*

**bay** [beı] *n* III **1.** *coğ.* buxta *(kiçik körfəz)*, körfəz; **2.** dirsək *(dağda, çayda)*

**bay** [beı] *n* IV **1.** dəfnə ağacı; **2.** *pl* dəfnə çələngi

**bay**[2] [beı] *adj* I kəhər; ~ **horse** kəhər at

**bay** [beı] *adj* II dəfnə; ~ **leaf** dəfnə yarpağı; ~ **tree** dəfnə ağacı; *Add a bay leaf to the soup! Şorbaya/Supa bir dəfnə yarpağı əlavə et/edin!*



**bay**[3] [beı] *v* **1.** hürmək; **2.** itlə təqib etmək *(vəhşi heyvanı)*; gəmişdirmək; **3.** dəf etmək, var gücü ilə müdafiə olunmaq;
◊ **to ~ at the moon** aya hürmək; mənasız işlə məşğul olmaq

**bay laurel** [ˈbeı.lɔrəl] *n bot.* nəcib dəfnə

**bayonet**[1] [ˈbeıənıt] *n* **1.** süngü; **to fix/to unfix a ~** süngünü taxmaq/çıxartmaq; **2.** *pl.* əsgər; *He had twenty-five bayonets under his command Onun komandanlığı altında iyirmi beş əsgər vardı*

**bayonet**[2] [ˈbeıənıt] *adj* süngü; ~ **charge / assault** süngü hücumu; ~ **thrust** süngü zərbəsi, süngü ilə zərbə

**bayonet**[3] [ˈbeıənıt] *v* **1.** süngüləmək, süngü ilə vurmaq; *The enemy bayoneted him in the back Düşmən onu arxadan süngü ilə vurdu;* **2.** silah gücünə məcbur etmək; **to ~ into submission** süngü ilə/silah gücünə özünə tabe etmək

**bay-window** [ˈbeıˈwındou] *n mem.* erker *(ev divarında pəncərələri olan yarımdairə şəklində və ya diş-diş çıxıntı)*

**bazaar** [bəˈza:ʳ] *n* **1.** bazar; **2.** universal bazar; böyük ticarət zalı; **3.** xeyriyyə bazarı *(ingilis dilli ölkələrdə kilsə xəstəxanalarına kömək üçün)*

**bazooka** [bəˈzu:kə] *n* "bazuka" *(reaktiv tankəleyhinə qumbaraatan silah)*

**be**[1] [bi:] *(tam forma)*; [bı] *(qısa forma) v (indiki zaman 1-ci şəxs forması:* **am** [æm]; *3-cü şəxs tək forması:* **is** [ız]; *qalan şəxslərin tək və cəm formaları:* **are** [a:]; *keçmiş zaman tək forması:* **was** [wɔz], cəm forması: **were** [wə:]) **1.** olmaq, var/mövcud olmaq; *I think, therefore I am Mən düşünürəm, deməkmən varam; He will be here all the year round O, bütün ili burada olacaq; Is he often in the village? O, kənddə tez-tezmi olur?;* **2.** -dır, -dir, -dur, -dür, idi; *The dog is in the garden İt bağdadır; The book is on the table Kitab stolun üstündədir; The child was at home Uşaq evdə idi;* **3.** bərabər olmaq; ibarət olmaq; *Two and two is four Iki üstəgəl iki dördə bərabərdir; Let x be ten Fərz edək ki, x ona bərabərdir;* **4. there** *sözü ilə başlanan ifadələrdə:* olmaq, mövcud olmaq; var olmaq; *There is a tree in the yard Həyətdə bir ağac var; Is there life in the Mars? Marsda həyat varmı?/mövcuddurmu? There are many English books in our library Bizim kitabxanada çoxlu ingilis kitabı var; There is plenty of time Kifayət qədər vaxt var; There will be a meeting tomorrow Sabah iclas olacaq*

**be**[2] [bi:] *bağlayıcı fel:* -dır, -dir, -dur, -dür; idi; *He is a doctor O, həkimdir; The box is heavy Qutu ağırdır; The bag is empty Çanta boşdur; The sentence is correct Cümlə düzdür; He was ten years old O, on yaşında idi; Seeing is believing Görmək inanmaqdır; What is it? Bu nədir? If I were you... Mən sənin/sizin yerinə/yerinizə olsa idim...; She is happy/tired/silent, etc. O, xoşbəxtdir/yorğundur/sakitdir və s.; They are at work Onlar işdədirlər*

**be**[3] [bi:] *modal fel;* -malı, -məli; *I was to buy a book Mən kitab almalı idim; He was to go home O, evə getməli idi; They are to come at six Onlar saat altıda gəlməlidirlər; She was to have come at five O, saat beşdə gəlməli idi; When am I to come? Mən nə vaxt/nə zaman gəlməliyəm?*

**be**[4] [bi:] *köməkçi fel:* **1.** *Davamedici zaman formalarını düzəltmək üçün işlədilir.* -maqda, -məkdə; -dır, -dir, -dur, -dür; *I am working Mən işləyirəm / işləməkdəyəm; The child is sleeping Uşaq yatır / yatmaqdadır; The children were playing in the yard Uşaqlar həyətdə oynayırdılar / oynamaqda idilər; The travellers will be going at that time tomorrow Sabah bu zaman səyahətçilər getməkdə/yolda olacaqlar*

**beach**[1] [bi:tʃ] *n* **1.** okeanın / dənizin / gölün çayın sahili; **2.** çimərlik; *There are several sandy beaches along the stretch of the coast in Baki Bakının dəniz sahili boyunca bir neçə qumlu çimərlik var;*
◊ **on the** ~ işsiz, pulsuz

**beach**[2] [bi:tʃ] *adj* çimərlik; ~ **robe** çimərlikdə geyilən xalat; ~ **umbrella** böyük çimərlik günlüyü/zontu; ~ **ball** çimərlik topu

**beach**[3] [bi:tʃ] *v* **1.** suya oturtmaq *(paroxod haq.)*; **2.** sahilə çıxartmaq *(qayığı və s.)*; **to ~ a boat** qayığı sahilə çıxartmaq; **3.** *hərb.* sahilə çıxmaq üçün sahilə yaxınlaşmaq

**beached** [bi:tʃt] *adj* sahilə çıxarılmış/atılmış

**beachwear** [bi:tʃweəʳ] *n* çimərlik paltarı/ geyimi

**beach-sand** [ˈbi:tʃsænd] *n* sahil /dəniz /çay qumu

**beachy** [ˈbi:tʃı] *adj* qənbərlik, qənbərlə örtülü, çınqılla örtülmüş

**beacon**[1] [ˈbi:kən] *n* **1.** mayak; siqnal ocağı; yolgöstərən ulduz; **~s of hope** ümid çırağı; **2.** dəniz fənəri; işıq mayağı; radiomayak; **3.** baken *(çayda, göldə dayaz yerləri və s. göstərmək üçün üzücü nişan)*; **4.** *av.* siqnal qülləsi

**beacon**[2] [ˈbi:kən] *v* **1.** siqnal işığı ilə işıqlandırmaq; **2.** *məc.* işıqlandırmaq; yol göstərmək; mayak/yolgöstərən ulduz olmaq

**bead**[1] [bi:d] *n* **1.** muncuq, muncuq dənəsi; şar, kürəcik; **to thread ~s** muncuq dənələrini sapa taxmaq; *She was wearing a string of green beads O, bir qatar yaşıl muncuq taxmışdı;* **2.** damcı *(tər, şeh və s. haq.)*; **~s of blood/of sweat** qan/tər damcıları; **to draw a ~ (on)** nişan almaq; *He drew a bead on the animal and fired O, heyvanı nişan aldı və atəş açdı;* **to tell/to say** *one's* **~s** təsbeh çevirib dua etmək

**bead**[2] [bi:d] *v* **1.** muncuqla bəzəmək; **2.** düzmək, keçirmək; **3.** damcı əmələ gətirmək; suluqlatmaq; suluq əmələ gətirmək; **4.** *d.d.* dua oxumaq

**beaded** [ˈbi:dıd] *adj* **1.** muncuqla bəzənmiş / bə-

zədilmiş; 2. qovuqla örtülmüş, qovuqlu; tər damcıları ilə örtülmüş; **a face ~ with sweat** tər damcıları ilə örtülmüş sifət

**bead-house** ['bi:dhaus] *n* əlillər evi

**beading** ['bi:dıŋ] *n* muncuqla bəzəmə; haşiyə, naxış, bəzək; muncuqlu tikmə

**beadle** ['bi:dl] *n* 1. universitet nəzarətçisi *(bəzi Britaniya universitetlərində)*; 2. kilsə gözətçisi; 3. *hüq.* məhkəmə xidmətçisi

**beadledom** ['bi:dldəm] *n* süründürməçilik, bürokratizm, rəsmiyyətçilik

**beadwork** ['bi:dwə:k] *n* muncuqla tikmə, muncuqlu tikmə, muncuqlu haşiyə

**beady** ['bi:dı] *adj* 1. muncuq kimi, muncuqvarı, muncuğabənzər, muncuğaoxşar; girdə və parlaq; **~ eyes** muncuq kimi gözlər; 2. damcı ilə örtülmüş *(tər və s.)*; 3. qabarcıqlı, qabarıq-qabarıq olan

**beagle** ['bi:gl] *n* 1. qısaayaqlı tazı *(it növü)*; 2. axtarıcı it; 3.*məc.* xəfiyyə, casus; 4. *amer.* sosiska

**beak**[1] [bi:k] *n* 1. dimdik; 2. dimdikşəkilli burun; 3. lülək *(çaynikdə və s.)*; 4. diş *(mişarda, daraqda və s.)*

**beak**[2] [bi:k] *v* 1. dimdikləmək; 2. dimdiklə vurmaq və ya tutmaq

**beaked** [bi:kt] *adj* 1. dimdikli, dimdiyi olan; 2. qarmaqvarı, qarmağaoxşar, qarmağabənzər; əyilmiş, qatlanmış; əyri

**beaker** ['bı:kə[r]] *n* 1. menzurka *(maye ölçmək üçün dərəcələrə bölünmüş stəkan)*; laboratoriya stəkanı; 2. şərab stəkanı, qədəh *(ayaqcıqsız)*; 3. *arx.* kubok

**beaky** ['bı:kı] *adj* 1. dimdikli; 2. dimdikvarı, dimdiyəoxşar; dimdiyəbənzər

**be-all** ['bi: ɔ:l] *n şair.*: **~ and end-all** həyat, hər şey, həyatda ən vacib şey; əzəl və axır; *Dearest, you are the be-all and end-all of my life Əzizim, sən mənim üçün həyatda hər şeysən*

**beam**[1] [bi:m] *n* 1. şüa, şölə; işartı; **a ~ of the sun** günəş şüası / şöləsi; **a ~ of hope** ümid şöləsi / işartısı; **a ~ of truth** həqiqət işartısı; 2. *fiz.* işıq seli; 3. tir, şalban; 4. dişlə, çillə *(qoşqu aləti)*; 5. kotan qolu; 6. tərəzi qolu; 7. *tex.* pərsəng, taraz;

◊ **on the ~** taraz, düz, necə lazımdırsa, **off the ~** səhv, yanlış, yalan

**beam**[2] [bi:m] *v* 1. şüa saçmaq / vermək; nur saçmaq, parlamaq; işıqlandırmaq; *The sun beamed through the clouds Günəş buludlar arasından parladı / işıq saçdı;* 2. üzü gülmək, sevinmək, gül kimi açılmaq, sevincdən gülümsəmək; *He beamed a cheerful welcome as he opened the door O, qapını açarkən üzü güldü; Her countenance beamed with smiles Onun çöhrəsi təbəssümdən şölələndi / parladı;* **to ~ at / upon *smb.*** bir kəsin üzünə mehribanlıqla gülümsəmək; 3. *fiz.* işıq seli buraxmaq; 4. yönəltmək, göndərmək, istiqamətləndirmək *(radio və televiziya siqnallarını)*; *The news was beamed to East Africa by satellite Xəbər Şərqi Afrikaya Yerin süni peyki vasitəsilə göndərildi / yayıldı*

**beam-ends** ['bi:m'endz] *n pl dən.* yanı üstə, böyrü üstə *(gəmi haq.)*; **on *one's* ~** çıxılmaz / çətin vəziyyət; *Can you help me out with a bit of money? I'm on my beam-ends this week Sən/Siz mənə kömək edə bilərsənmi / bilərsinizmi? Bu həftə mən çıxılmaz vəziyyətdəyəm*

**beaming**[1] [bi:mıŋ] *n* 1. şüalanma, şüavermə; işığa salma; buraxma, saçma, yayma *(işıq, isti və s. haq.)*; 2. *fiz.* işığı bir yerə yığma

**beaming**[2] [bi:mıŋ] *adj* 1. şüalanan, şüaverən, işıq saçan; 2. parlaq, şəfəqli; nursaçan, şəfəqsaçan

**beamy** [bi:mı] *adj* 1. parlaq, nurlu; şüalanan; nursaçan, işıqsaçan; 2. böyük, nəhəng, geniş *(gəmi haq.)*

**bean** [bi:n] *n* 1. lobya, maş, paxla; **coffee ~s** kofe paxlası; **horse ~s** atlı lobya; 2. noxud dənəsi; 3. lobya bitkisi;

◊ **old ~** *Dost! Dostum! (müraciət)*; **not to care a ~ for/about *smth.*** bir şeyə qarşı tamamilə laqeyd olmaq/qalmaq; **a hill of ~s** cəfəngiyyat; **to spill the ~s** 1) sirri vermək; 2) planı pozmaq; 3) pis vəziyyətdə qalmaq

**beanpole** ['bi:npoul] *n* 1. lobyanın dırmaşması üçün paya; 2. şüvül; 3. *d.d.* uzundıraz /uzunboy adam

**bean-stick** ['bi:nstik] *n* = **beanpole**

**bear**[1] [beə[r]] *n* 1. ayı; **to play the ~** ayı kimi hərəkət etmək, kobudluq etmək, yöndəmsiz olmaq; *What a bear! Bu nə ayıdır!* 2. *astr.* **Great Bear** Böyük Ayı bürcü; **Little/Lesser Bear** Kiçik Ayı bürcü; 3. lif süpürgə *(gəminin göyərtəsini yumaq üçün)*; 4. ayaqaltı; payəndaz

**bear**[2] [beə[r]] *v (pt* **bore** [bɔ:[r]]*; pp* **borne, born** [bɔ:n]*)* 1. aparmaq, daşımaq; *The ship bore him to a distant country Gəmi onu uzaq ölkəyə götürüb apardı; The mules carrying the baggage remained behind Bağlama daşıyan / aparan qatırlar arxada qaldı;* **to ~ banner** bayraq aparmaq; *The boat was borne backward by the wind Külək qayığı geri apardı;* 2. getmək, yollanmaq, yola düşmək, hərəkət etmək; **to ~ east/north/south/west** şərqə/şimala/cənuba/qərbə hərəkət etmək/yollanmaq; 3. dönmək; **to ~ to the right/to the left** sağa/sola dönmək; *When you come to the bridge bear to the right Körpüyə çatanda sağa dön/dönün;* 4. olmaq, malik olmaq, **to ~ the sign /trace** işarəsi/izi olmaq, işarəyə/izə malik olmaq; *Her face bore signs of tears Onun sifətində göz yaşlarının izləri vardı;* 5. tab gətirmək, davam gətirmək, dözmək *(işgəncəyə, ağrıya, ağırlığa və s.)*; **to ~ pain** ağrıya dözmək/tab gətirmək; **to ~ torture** işgəncəyə/tab gətirmək/ dözmək; *Will the ice on the lake bear your weight? Gölün üstündəki buz sənin/sizin ağırlığına/ağırlığınıza tab gətirəcəkmi/dözəcəkmi?*; 6. çıxmaq *(imtahandan, sınaqdan)*; **to ~ a test** sınaqdan çıxmaq; 7. qatlaşmaq, dözmək; **to ~ strain** gərginliyə dözmək; 8. *(adətən sual və inkar cümlələrdə)* zəhləsi getmək, görməyə gözü olmamaq; *I cannot bear him Mənim ondan zəhləm gedir, Mənim onu görməyə gözüm yoxdur;* 9. çəkmək; boynuna götürmək *(xərci, itkini)*; **to ~ losses** itkini boynuna götürmək; **to ~ expenses** xərci çəkmək; *Let him bear the expenses Qoy xərci o boynuna götürsün/çəksin;* 10. vermək *(şahidlik)*; **to ~ evidence/testimony/witness** şahidlik vermək, şahidlik etmək; **to ~ false witness (against)** yalançı şahidlik etmək, yalandan şəhadət vermək; 11. gizlətmək, gizləmək, gizli saxlamaq/tutmaq; bəsləmək *(hiss və s.)*; **to ~ malice** kin / ədavət bəsləmək; **to ~ love** məhəbbət bəsləmək; 12. yaymaq, intişar etdirmək; **to ~ tales** şayiə yaymaq; **to ~ good news** yaxşı xəbər yaymaq; 13.: **to ~ resemblance** oxşarı olmaq; **to ~ relation** əlaqəsi olmaq; *It bears no relation to the matter Bunun məsələyə heç bir dəxli yoxdur;* 14. doğmaq; *His wife has borne 6 fine children Onun arvadı 6 qəşəng uşaq doğub;*

◊ **to ~ arms** 1) silah daşımaq; 2) orduda qulluq etmək; **to ~ arms against *smb.*** bir kəsə qarşı silah qaldırmaq; bir kəsə qarşı silahlı mübarizə aparmaq; **to ~ a part in *smth.*** bir şeydə iştirak etmək; **to ~ in mind** yadda saxlamaq; **to ~ a hand** kömək etmək; *Bear a hand! Kömək et/edin! Bear for action! Hücum! (komanda)*; **to ~ *smb.* in hand** 1) bir kəsi əldə saxlamaq; 2) *arx.* aldatmaq, başını bişirmək; **to ~ *one's* age well** yaşına nisbətən cavan görünmək; **to ~ *smb.* a grudge** bir kəsə qarşı kin saxlamaq, bir kəsə ədavət bəsləmək

**bearable** ['beərəbl] *adj* 1. dözülə bilən, dözümlü; **~ pain** dözülə bilən ağrı; *The doctor said that the pain would be just bearable Həkim dedi ki, ağrı dözülə bilən olacaq;* 2. mümkün ola bilən, yol verilə bilən; **~ load** mümkün ola bilən/yol verilə bilən yük

**bearably** ['beərəblı] *adv* dözülə bilən *(bir)* tərzdə; babat; orta; mümkün olan *(bir)* tərzdə / surətdə

**bear-cat** ['beəkæt] *n* 1. *zool.* panda *(Himalay dağlarında yaşayan kiçik yırtıcı heyvan)*; 2. qoçaq, igid, cəsur, dəliqanlı; igid / cəsur / qoçaq döyüşçü

**beard**[1] [bıəd] *n* 1. saqqal; **long /grey /red ~** uzun /çal/qırmızı saqqal; 2. *bot.* qılcıq *(sünbüldə)*; rişə *(bitkidə)*; 3. diş *(mişarda, daraqda, çarxda və s)*;

◊ **to *one's* ~** açıq, açıq-açığına; üzünə; **to speak in *one's* ~** anlaşılmaz bir tərzdə danışmaq, burnunun altında mızıldamaq; **to laugh in *one's* ~** bığaltı gülmək, xəlvəti gülmək/gülümsəmək; **to take by the ~** cəsarətlə danışmaq, işə ciddi girişmək

**beard**[2] [bıəd] *v* 1. cəsarətlə əleyhinə çıxmaq/çıxış etmək; *She bearded the committee and demanded an explanation O, komitəyə qarşı cəsarətlə çıxdı və izahat tələb etdi*; 2. saqqalını qırxmaq

**bearded** ['bıədıd] *adj* saqqallı; bığlı, yekəbığ; **a ~ man** saqqallı kişi; *I don't remember his name, but he was a tall bearded man Mən onun adını xatırlamıram, lakin o, ucaboy saqqallı bir kişi idi*

**bearded oat** ['bıədıd'out] *n bot.* vələmir

**bearded wheat** ['bıədıd'wi:t] *n bot.* qılçıqlı buğda

**beardie** ['bıədı] *n zool.* şimal qızılbalığı

**beardless** ['bıədlıs] *adj* 1. saqqalsız, bığsız; **~ lad** bığsız/üzü tüksüz gənc; 2. *bot.* qılçıqsız; rişəsiz

**bear-dog** ['beədɔg] *n* ovda ayının üstünə gedən it

**bearer** ['beərə[r]] *n* 1. aparan, daşıyan; *Please help the bearer of this letter Zəhmət olmasa bu məktubu aparana kömək et / edin;* **flag ~** bayraqdar, bayraq aparan; 2. dəfn mərasimində cənazə aparan adam; 3. yükdaşıyan, hambal; 4. barverən; *This tree is a good bearer Bu ağac yaxşı barverəndir*

**bear-hug** ['beəhʌg] *n* 1. ayı güləşi; 2. *id.* tutma, yapışma *(güləşdə)*

**bearing**[1] ['beərıŋ] *n* 1. duruş, qamət, vüqar, görkəm, boy-buxun; **upright / proud ~** vüqarlı görkəm/duruş / boy-buxun; **the ~ of a soldier** hərbi duruş, əsgər duruşu; 2. gəzdirmə; daşıma; **the ~ of arms** silah gəzdirmə; *The bearing of arms is forbidden Silah gəzdirmək qadağandır/yasaqdır;* 3. doğma, doğuş, doğuluş; 4. barvermə, bargətirmə; **to keep trees in ~** bar vermək üçün ağaclara xidmət etmək; 5. bar, bəhər, meyvə; **rich mellow ~s** yetişmiş bol bəhər; 6. rəftar, davranış, hərəkət/davranış tərzi; *We loved her for her kindly bearing Biz onu xoş davranışına görə sevdik;* 7. səbir, dözüm, hövsələ; səbat, mətanət; **beyond all ~** dözülməz tərzdə / surətdə; *There is no bearing him O, dözülməzdir;* 8. yanaşma, münasibət göstərmə, baxma; münasibət, baxış, nöqteyi-nəzər; tərəf; **to consider a matter in all its ~s** məsələyə hərtərəfli yanaşmaq / baxmaq, məsələni hərtərəfli müzakirə etmək; **the legal ~s of a case** məsələnin /işin hüquqi tərəfi; **to have no ~ on the subject** məsələyə heç bir dəxli olmamaq; 9. məna; **the precise ~ of the word** sözün dəqiq mənası; 10. istiqamət, oriyentasiya; səmt; **to take *one's* ~s** öz vəziyyətini dərk etmək/müəyyənləşdirmək; **the ~s of *smth.*** bir şeyin olduğu yer / məkan; **to lose *one's* ~s** azmaq, səmtini itirmək; **to be out of ~s** özünü itirmək, çaşmaq, karıxmaq; dalaşmaq

**bearing**[2] ['beərıŋ] *adj* 1. daşıyıcı, aparıcı; dayaq; **~ cable** aparıcı kabel; **~ pile** dayaq, dirək; 2. barverən, meyvəverən; 3. doğan, törədən

**bearish** ['beərıʃ] *adj* qaba, kobud, ədəbsiz, nəzakətsiz; yonulmamış, yontalanmamış, mədə-

niyyətsiz; ~ **fellow** "ayı", kobud, qaba, ədəbsiz adam

**bearishly** [ˈbeərɪʃlɪ] *adv* kobud, kobudcasına, qaba, qabacasına, mədəniyyətsiz, ədəbsizliklə, ədəbsiz/kobud/qaba tərzdə

**bearishness** [ˈbeərɪʃnɪs] *n* kobudluq, qabalıq, ədəbsizlik, mədəniyyətsizlik

**bear oak** [ˈbeərˈouk] *n bot.* balaca / cırtdan palıd

**bear-pit** [ˈbeəpɪt] *n* ayı zağası

**bearskin** [ˈbeəskɪn] *n* **1.** ayı dərisi; ayı xəzi; **2.** ayı dərisindən hazırlanmış gəbə; ayı dərisindən hazırlanmış örtük; **3.** Britaniya əsgərlərinin müəyyən mərasimlərdə geydikləri hündür xəz papaq

**bear up** [ˈbeəˈʌp] *v* **1.** cəsarət göstərmək, mətanətlə dözmək, sınmamaq; **to ~ against misfortune** bədbəxtliyə mətanətlə dözmək; **2.** çətinə düşmüş bir adama əl tutmaq/kömək etmək; **3.** ruhlandırmaq, ürək-dirək vermək; müdafiə etmək; **to ~ a principle** prinsipi / mövqeyi müdafiə etmək

**bear with** [ˈbeəˈwɪð] *v* dözmək, dözüm göstərmək, dözümlü / səbirli olmaq; tab gətirmək; *You must bear with his bad temper; he has recently been ill Sən / Siz gərək onun hövsələsizliyinə dözəsən / dözəsiniz; o bu yaxınlarda xəstə olub*

**bearward** [ˈbeəwɔ:d] *n* ayı sürüsündə başçı

**bearwarden** [ˈbeəwɔ:dn] *n* = **bearward**

**bearwood** [ˈbeəwud] *n bot.* murdarça, murdaşar

**beast** [ˈbi:st] *n* **1.** *(vəhşi)* heyvan, *(yırtıcı)* heyvan; *(məməli)* heyvan; **a ~ of burden** yük heyvanı; **a ~ of prey** yırtıcı heyvan; **wild ~** vəhşi heyvan; **2.** *k.t.* ...baş heyvan, mal, mal-qara; **herd of forty ~(s)** qırx baş heyvandan ibarət naxır; **heavy ~s** mal-qara, iribuynuzlu mal-qara; **light ~s** davar, xırdabuynuzlu mal-qara; **3.** *(insan haq.)* heyvan, qanmaz, əclaf; **a ~ of a man** heyvan / qanmaz / əclaf adam; **a ~ of a job** çox çətin/yaramaz/ zəhlətökən iş; **drunken ~** sərxoş/kefli heyvan; **to make a ~ of oneself** özünü heyvan kimi aparmaq, özünü heyvan yerinə qoymaq, heyvanlıq etmək; **4.** *zaraf.* höcət/pis adam; *Don't be a beast, do as I ask you Höcətlik etmə/etməyin, necə deyirəmsə, elə də et / edin*

**beast-fly** [ˈbi:stflaɪ] *n zool.* mozalan, heyvan milçəyi

**beastliness** [ˈbi:stlɪnɪs] *n* heyvanlıq; əclaflıq, yaramazlıq, nankorluq, murdarlıq; **to live in a state of ~** heyvan kimi yaşamaq; *This book is sheer beastliness Bu kitab hər cür alçaqlıqla doludur*

**beastly**[1] [ˈbi:stlɪ] *adj* **1.** qaba, yaramaz, əclaf, çirkin, heyvan kimi; **a ~ person** çox pis/heyvan kimi/əclaf adam; **2.** xoşagəlməz, xoşagetməz; çox bərk / pis, iyrənc; **~ weather** çox pis hava; **a ~ cold** çox bərk soyuq; *What beastly weather! Nə iyrənc havadır!*

**beastly**[2] [ˈbi:stlɪ] *adv* **1.** çox, bərk, dəhşətli; *It's beastly cold today Bu gün dəhşətli / bərk soyuqdur;* **2.** iyrənc, əclaf, yaramaz, donuz kimi; heyvan kimi; *He is beastly drunk O, donuz/heyvan kimi sərxoşdur*

**beat**[1] [bi:t] *n* **1.** zərbə; vurma, çalma *(zəng)*; **the ~ of a drum** təbil səsi; **the ~ of heart** ürəyin vurması; **2.** ritm, ahəng, vəzn; takt; *Every member of the band must follow the beat very closely Orkestrin hər bir üzvü ritmi/taktı ciddi surətdə izləməlidir;* **3.** keşikdə olma, keşik/patrul çəkmə; patrul; gəzmə, baş çəkmə; patrul edilən ərazi; **to be on the ~** keşik marşrutunu dolanmaq; **a policeman on his ~** öz ərazisində olan polis nəfəri; **a street-walker on the ~** "ova" çıxmış fahişə;

◊ **to be off *one's* ~** səlahiyyəti olmamaq; *It is off my beat Bu mənim səlahiyyətim xaricindədir, Bu mənim səlahiyyətimə daxil deyil*

**beat**[2] [bi:t] *adj* yorğun, əldən düşmüş; *I am beat after all that work Mən bütün bu işlərdən sonra yorulmuşam/əldən düşmüşəm*

**beat**[3] [bi:t] *v (pt* **beat**; *pp* **beaten** [ˈbi:tn], **beat)** **1.** vurmaq, döymək; döyəcləmək; **to ~ on / at the door** qapını döymək; *His father beat the disobidient son Ata sözəbaxmayan oğlunu döydü; The rain was beating against the window Yağış pəncərəni döyəcləyirdi; He beats his wife O, arvadını döyür; Waves beat against the shore Dalğalar sahili döyəcləyir; The hailstorm has beaten the wheat Dolu taxılı vurub;* **to ~ with a stick** ağacla döymək; **to ~ with a whip** qamçı ilə döymək, qamçılamaq; **to ~ to death** ölənə qədər / ölüncə döymək; **to ~ black and blue** döyüb bədənini gömgöy / qapqara etmək; *He was beating his horse mercilessly O, atını amansızcasına döyürdü;* **2.** çırpmaq *(mütəkkəni və s.)*; çalmaq *(yumurtanı və s.)*; **to ~ pillows** balışları çırpmaq; **to ~ egg whites** yumurtanın ağını çalmaq; **to ~ dough** xəmir yoğurmaq; **3.** əzmək, parçalamaq; **to ~ to powder** əzib toz halına salmaq; **to ~ to pieces** hissələrə parçalamaq, parça-parça etmək; **4.** udmaq, qalib gəlmək, üstün gəlmək; *Their team was beaten Onların komandası uduzdu; He beat his adversary in the last round O, rəqibinə axırıncı raundda qalib gəldi; I can beat you at swimming Mən üzməkdə sənə qalib gələ bilərəm; The enemy was beaten Düşmən məğlub edildi;* **to ~ *smb.* on points** *id.* bir kəsə xal hesabı ilə qalib gəlmək; **5.** üstün/daha yaxşı olmaq; **to ~ all** hamıdan üstün olmaq; **6.** döyünmək, çırpınmaq; *His heart was beating Onun ürəyi döyünürdü/çırpınırdı; Her heart was beating with joy Onun ürəyi sevincdən çırpınırdı;* **7.** dalğalanmaq; *The flag was beating in the winds Bayraq küləkdə dalğalanırdı;* **8.** çırpılmaq; *The waves were beating against the shore Dalğalar sahilə çırpılırdı;* **9.** axtarmaq, hər tərəfi axtarmaq, gəzmək *(bir şeyi tapmaq üçün)*, sürək təşkil etmək; **to ~ the jungle for monkeys** meymun tutmaq üçün cəngəllikdə sürək təşkil etmək; **to ~ the woods** meşəni axtarmaq; **to ~ the town for *smb.*** bir kəsi tapmaq üçün şəhəri axtarmaq/ ələk-vələk etmək; *Beat it! Rədd ol! İtil!;* **to ~ the drum** baraban çalmaq; **to ~ alarm** həyəcan qaldırmaq; **10.** üyütmək *(taxılı)*; **11.** didmək *(kətanı)*; **12.** açmaq, salmaq *(yol və s.)*; **to ~ a path** cığırol salmaq/açmaq; **to ~ *one's* way through** özünə yol açmaq; *He beat his way through the crowd O, izdihamın içindən özünə yol açdı;*

◊ **to ~ up and down 1)** çapalamaq, çırpınmaq; vurnuxmaq; **2)** tərəddüd etmək, qərarsızlıq/qətiyyətsizlik göstərmək; **to ~ the streets** küçələrdə veyllənmək, veyl-veyl gəzmək/ avaralanmaq; **to ~ *one's* head against the wall** başını divara vurmaq; **to ~ *one's* breast** döşünə döymək; **to ~ *one's* brains/head *(out)* with/ about on *smth.*** bir şey üzərində başını sındırmaq/çatlatmaq; **to ~ the hoof** ayaq döymək, piyada gəzmək



**beat-ax** [ˈbi:tæks] *n* toxa; kərki; çapacaq; qiyməkeş

**beaten**[1] [ˈbi:tn] *adj* **1.** məğlub edilmiş /olmuş; **~ army** məğlub olmuş/edilmiş ordu; **~ enemy** məğlub olmuş düşmən; **~ champion** məğlub olmuş çempion; *The beaten army ran before the victorious enemy Məğlub olmuş/edilmiş ordu qalib düşmənin qabağından qaçdı;* **2.** döyülmüş, döyülüb müəyyən formaya salınmış; *The doors of the palace were of beaten gold Sarayın qapıları döyülmüş qızıldan idi;* **3.** tapdalanmış, tapdanmış, tapdaq edilmiş; **~ path/track** tapdanmış / tapdaq edilmiş cığır; *We followed a well-beaten path through the forest Biz meşənin içindən yaxşı tapdanmış cığırla getdik*

**beaten**[2] [ˈbi:tn] **to beat** *felinin pp forması*

**beater** [ˈbi:təʳ] *n* **1.** sürəkçi *(ov heyvanlarını və quşlarını ovçunun üstünə qovan adam)*; **2.** dəstə *(həvəngdə)*; kürəcik *(məhlul qızdırmaq üçün)*; xalçaçırpan *(xalça-palaz çırpmaq üçün alət)*; çalan *(yumurta və s.)*; **an egg ~** yumurtaçalan

**beatific** [ˌbi:əˈtɪfɪk] *adj* bəxtiyar; fərəhli, şad, sevinclə dolu; **~ smile** bəxtiyar / fərəhli / sevinclə dolu təbəssüm

**beatifical** [bi:əˈtɪfɪkəl] *adj* = **beatific**

**beatifically** [bi:əˈtɪfɪkəlɪ] *adv* ləzzətlə, həzzlə, məmnunluqla, sevinclə

**beatification** [bɪəˌætɪfɪˈkeɪʃn] *n* **1.** xeyir-dua vermə, xoşbəxtlik arzu etmə; xeyir-dua; **2.** *din.* övliyalar sırasına keçirmə

**beatify** [bɪˈætɪfaɪ] *v (pt, pp* **–fied)** **1.** xeyir-dua vermək; **2.** *din.* övliyalar sırasına keçirmək

**beating** [ˈbi:tɪŋ] *n* **1.** döymə, vurma; döyülmə; **to give a ~** döymək; *His father gave him a beating Atası onu döydü;* **2.** məğlubiyyət, basılma; *Tom played with him at tennis and I got a good beating Tom onunla tennis oynadı və (onu) yaxşıca uddu; We gave the enemy a good beating Biz düşməni darmadağın etdik;* **3.** çalma *(yumurtanı və s.)*; **4.** ahəngdar tıqqıltı; **the ~ of a watch** saatın tıqqıltısı; **5.** döyünmə; döyüntü; **the ~ of the heart** ürəyin döyünməsi / döyüntüsü;

◊ **~ down** *k.t.* taxılın yatması *(güclü yağış və s. nəticəsində)*

**beatitude** [bɪˈætɪtju:d] *n* **1.** xoşbəxtlik, səadət; ləzzət, məmnunluq, fərəh; **2.** xeyir-dua vermə, xoşbəxtlik arzu etmə; **3.** = **beatification** *(2-ci mənada)*

**beaut**[1] [bju:t] *n amer.* gözəllik

**beaut**[2] [bju:t] *adj* qəşəng, son dərəcə gözəl *(əşyalar və s. haq.)*; *The food was beaut Yemək son dərəcə qəşəng idi; The weather was beaut Hava çox gözəl idi*

**beauteous** [ˈbju:tɪəs] *adj şair.* gözəl; *It is a beauteous evening Gözəl axşamdır*

**beautician** [ˈbju:tɪʃn] *n* kosmetoloq *(bədənə, üzə təravət və gözəllik verən şəxs)*

**beautification** [ˌbju:tɪfɪˈkeɪʃn] *n* bəzəmə, bəzək / zinət vermə, zinətləndirmə

**beautiful** [ˈbju:təfl] *adj* **1.** gözəl, çox gözəl; əla, çox yaxşı; **a ~ face/poem/painting** gözəl sifət/şer/şəkil; **a ~ woman/ girl/rose** gözəl qadın/qız/gül; **a ~ voice** gözəl/əla səs; **~ weather** əla/gözəl hava; **~ soup/dinner/wine** əla şorba/nahar/şərab; *Your soup was really beautiful, Jane Ceyn, sənin/sizin şorban/şorbanız həqiqətən əla idi*

**beautifully** [ˈbju:təfəlɪ] *adv* gözəl, qəşəng, qəşəngcə; **to play the piano ~** gözəl / qəşəng piano çalmaq; **to write/to read/to speak ~** gözəl yazmaq/oxumaq/danışmaq; *She speaks English beautifully O, ingiliscə gözəl danışır*

**beautify** [ˈbju:tɪfaɪ] *v* gözəlləşdirmək, gözəl etmək, bəzəmək, zinət/bəzək vermək, zinətləndirmək

**beauty**[1] [ˈbju:tɪ] *n* **1.** gözəllik; **~ of form / voice /verse/feeling** formanın/səsin/şerin / hissiyyatın gözəlliyi; **spiritual ~** mənəvi gözəllik; **beauties of nature** təbiətin gözəllikləri; *Smile was one of her beauties Təbəssüm onun gözəlliklərindən biri idi;* **2.** gözəl; "Seven Beauties" "Yeddi gözəl" *(Nizami)*; *She is a real beauty! O əsl / həqiqətən gözəldir*

**beauty**[2] [ˈbju:tɪ] *adj* gözəllik; **~ parlour / shop / salon** kosmetika/gözəllik salonu; **~ soap** gözəllik sabunu; **~ sleep** gözəllik yuxusu *(gecə saat 12-yə qədər olan yuxu)*; **~ doctor** kosmetoloq; **~ queen** gözəllik yarışının qalibi; **~ show** gözəllik müsabiqəsi / konkursu;

◊ **~ is but skin-deep** gözəllik əbədi / daimi deyil; *Beauty is in the eye of the beholder / lover at. söz.* ≅ *Könül sevən göyçək olar*

**beaver**[1] ['bi:vəʳ] *n* 1. *zool.* qunduz; 2. qunduz dərisi;
◊ **to work like a ~** var gücü ilə işləmək
**beaver**[2] ['bi:vəʳ] *adj* qunduz; **~ collar** qunduz yaxalıq *(qunduz dərisindən tikilmiş)*
**bebop** ['bi:bɔp] *n* bibop *(caz musiqisi)*
**becall** [bɪ'kɔ:l] *v* söymək, adlandırmaq *(pis sözlə)*
**becalm** [bɪ'ka:m] *v* sakitləşdirmək, sakit etmək, rahatlaşdırmaq, rahat etmək, təskinləşdirmək, təskin etmək; təskinlik vermək, ovundurmaq
**became** [bɪ'keɪm] **to become** *felinin pt forması*
**because** [bɪ'kɔz] *conj* çünki, ona görə ki; *We stayed at home because it rained Biz evdə qaldıq, çünki yağış yağırdı; The child was crying because he was hungry Uşaq ağlayırdı, çünki / ona görə ki, ac idi;* **~ of** ...üstündə, ...üzündən, ...ucbatından, ...görə; *I came back because of the rain Mən yağışa görə/yağışın ucbatından geri qayıtdım;* **~ of me** mənə görə; **~ of the children** uşaqlara görə; *I said nothing because of the children Mən uşaqlara görə heç nə / heç bir şey deməmdim*
**beck**[1] [bek] *n* hərəkət, işarə; əl hərəkəti ilə / başı tərpətməklə verilən işarə və s.; **to give a ~** işarə vermək;
◊ **to be at** ***smb.'s*** **~ and call** tamamilə bir kəsin əlində *(təsiri altında)* olmaq; buyruq qulu olmaq, buyruqları yerinə yetirməyə hazır olmaq; əmrə hazır/müntəzir olmaq
**beck**[2] [bek] *v* 1. işarə vermək *(başı tərpətməklə, əllə)*; 2. başdan/yoldan çıxarmaq, tovlamaq
**beckon**[1] ['bekən] *n* 1. baş hərəkəti, başla işarə; razılıq və s. mənasında baş əymə; 2. ovçu tütəyi, sümsü, gigit *(quş və heyvanları aldadıb çağırmaq üçün alət)*
**beckon**[2] ['bekən] *v* 1. baş hərəkəti/işarəsi ilə yanına çağırmaq; işarə ilə yanına çağırmaq; **to ~ with the hand** əl işarəsilə yanına çağırmaq; *She beckoned me to follow her O, əli ilə işarə etdi ki, onun arxasınca gedim;* 2. heyvanları/quşları xüsusi səsli alətlə çağırıb aldatmaq/ovlamaq
**becloud** [bɪ'klaud] *v* 1. örtmək, bürümək, çulğalamaq *(bulud haq.)*; 2. qarışdırmaq *(fikri)*; 3. gizləmək, gizlətmək; **to ~ unpleasant facts** xoşagəlməz sübutları / dəlilləri / faktları gizlətmək
**become**[1] [bɪ'kʌm] *v* (*pt* **became** [bɪ'keɪm], *pp* **become**) 1. olmaq; *He became a teacher O, müəllim oldu; It became clear that he was right Məlum oldu ki, o, haqlıdır; In the end he became mad Nəticədə o, dəli oldu;* 2. yaraşmaq, tutmaq *(paltar haq.); This new dress becomes you, my dear Bu təzə don sənə/sizə yaraşır, əzizim; These words don't become a person like you Bu sözlər sənin / sizin kimi adama yaraşmır; It doesn't become you to complain Şikayət etmək sənə / sizə yaraşmır;* 3. Bağlayıcı fel kimi işlənərkən adətən Azərbaycan türkcəsinə tərcümə edilmir: **to ~ angry** hirslənmək; **to ~ cold** soyuqlaşmaq; **to ~ thin** arıqlamaq; **to ~ red** qızarmaq; **to ~ accustomed** öyrəşmək, alışmaq, adət etmək; *Having heard the bad news he became angry Pis xəbəri eşidərkən o hirsləndi; Being ill for a long time she became thin Uzun müddət xəstə olduğundan o arıqladı*
**becoming**[1] [bɪ'kʌmɪŋ] *n* 1. əmələ gəlmə, təşəkkül tapma; 2. ədəb, nəzakət, əxlaq, ləyaqət
**becoming**[2] [bɪ'kʌmɪŋ] *adj* yaraşan, layiq olan, münasib olan, layiq, münasib, uyğun; **words ~ to the occasion** vəziyyətə münasib/uyğun sözlər; **conduct not ~ to a lady** xanıma yaraşmayan hərəkət; **with a modesty ~ his age** yaşına uyğun gələn /layiq olan təvazökarlıqla; *She was wearing a very becoming hat O özünə yaraşan şlyapa geymişdi; Blue always looks very becoming on her Mavi (rəng) həmişə ona yaraşır, Mavi rəng onu yaxşı tutur*
**becomingly** [bɪ'kʌmɪŋlɪ] *adv* ədəblə, layiqli, yaraşan; **to dress ~** layiqli/ədəblə geyinmək; *The little girl was dressed becomingly, The little girl was becomingly dressed Balaca qız layiqli/ədəblə geyindirilmişdi*
**bed**[1] [bed] *n* 1. çarpayı; yatacaq, yorğan-döşək; yataq yeri; yataq; **a comfortable ~** rahat çarpayı / yatacaq; **folding ~** açılıb-yığılan/qatlanan çarpayı; **single ~** biradamlıq çarpayı; **double ~** ikiadamlıq çarpayı; **soft ~** yumşaq çarpayı; **hard ~** bərk çarpayı / yatacaq yeri; **spring ~** yaylı çarpayı; **twin ~s** qoşa çarpayı; **a ~ of straw** saman doldurulmuş döşək, saman döşəyi; *The soldiers lay down on a bed of straw Əsgərlər saman döşəyin üstündə uzandılar;* 2. kəbin; **the eldest son of the second ~** ikinci kəbindən olan böyük oğul; 3. *şair.* ölüm yatağı; qəbir; **the ~ of death** qəbir; **narrow ~, ~ of dust** qəbir; 4. gecələmək üçün yer; **~ and breakfast** gecələmək üçün yer və səhər yeməyi; 5. lək, kərdi; **a ~ of onions** bir lək soğan, soğan ləki; 6. *k.t.* toxum səpmək üçün hazırlanmış torpaq; 7. kolluq, pöhrəlik, cəngəllik; **~ of nettles** gicitkənlik, gicitkən pöhrəliyi; **~ of rushes** qamışlıq, qamış pöhrəliyi; 8. yataq *(çay haq.)*, dib *(dəniz haq.)*; 9. *tik.* özül; *This hut rests on a bed of cement Bu koma sement özül üzərində dayanır;*
◊ **to go to ~** yatmaq; *I go to bed at twelve at night Mən gecə saat on ikidə yatıram;* **to take** ***one's*** **~** yataqda uzanmaq; **to keep to** ***one's*** **~** yataqdan durmamaq *(xəstə haq.)*; **to leave** ***one's*** **~** yataqdan qalxmaq *(xəstə haq.)*; **to put a child to ~** uşağı yatırtmaq; **to make the ~** 1) yer salmaq; 2) yeri yığmaq *(səhər)*; **to change the ~** yataq dəyişəyini dəyişmək; **to be false to** ***one's*** **~** arvadına xəyanət etmək; **to put to ~ with a shovel** basdırmaq, qəbirə qoymaq; **to die in** ***one's*** **~** öz əcəli ilə ölmək; **to go to ~ in** ***one's*** **boots** ölü kimi kefli olmaq; **to go to ~ with** nigahsız yaşamaq, cinsi əlaqədə olmaq *(nigahsız); You have made your bed and you must lie on it at. söz. Yeri özün salmısan özün də yatmalısan;* ≅ *Nə əkərsən onu da biçərsən; Öz cəzundır, çək Balaş*
**bed**[2] [bed] *adj:* **~ sheet** mələfə; **~ linen** yatacaq dəyişəyi; **~ jacket** gecə koftası; **~ rest** yataq rejimi *(xəstənin)*; **~ capacity** xəstəxanada olan çarpayıların sayı; **~ warmer** yataq qrelkası *(içi isti su ilə doldurulmuş və yatağı isitmək üçün istifadə edilən qovluq)*
**bed**[3] [bed] *v* (**-dd-**) 1. yatırtmaq; 2. yatmaq, yatacağa uzanmaq; **to ~ with** ***smb.*** bir kəslə yatmaq, **to ~ down** kəbinsiz yaşamaq/bir yastığa baş qoymaq; 3. əkmək, basdırmaq *(bitkini)*; **to ~ out flowers** çiçək/gül əkmək; 4. cinsi əlaqədə olmaq; *After many efforts the man succeeded in bedding her Bir çox cəhddən sonra kişi onunla cinsi əlaqəyə müvəffəq oldu*
**bedaub** [bɪ'dɔ:b] *v* çirkləndirmək, batırmaq, bulamaq; **to ~ a wall with mud** divarı palçıqla çirkləndirmək / bulamaq
**bedazzle** [bɪ'dæzl] *v* parıltı ilə gözü qamaşdırmaq
**bedbug** ['bedbʌg] *n* taxtabiti
**bedcap** ['bedkæp] *n* gecə papağı
**bedclothes** ['bedklouðz] *n* yataq dəyişəyi və yorğan
**bedcover** ['bed.kʌvəʳ] *n* örtük *(çarpayı üçün)*
**bedding** ['bedɪŋ] *n* 1. yorğan-döşək; döşək; 2. heyvan üçün döşənək, heyvan yatan yerə tökülmüş quru peyin, kövşən, saman və s.; *The dried grass will make good bedding for the animals Qurudulmuş ot heyvanlar üçün yaxşı döşənək olar*
**bedding-out** ['bedɪŋ'aut] *n* torpağa basdırma *(dibçək güllərini)*
**bedeck** [bɪ'dek] *v* bəzəmək; zinət / bəzək vermək; **~ed with jewels** zinət şeyləri ilə bəzədilmiş; *The cars were all bedecked with flowers and ribbons for the ceremony Maşınlar mərasim üçün başdan-başa çiçəklərlə və lentlərlə bəzədilmişdi*
**bedevil** [bɪ'devl] *v* (**-ll-**) 1. dolaşıq / pırtlaşıq salmaq; qarışdırmaq, qarışıq salmaq; azdırmaq, yoldan çıxartmaq; çaşdırmaq; *That difficult question has been bedevilling me for some time O çətin sual məni bir neçə müddətdir ki, çaşbaş salıb;* 2. əziyyət / əzab vermək, incitmək, iztirab vermək; 3. xarab etmək, korlamaq; zay etmək, pisləşdirmək; təhrif etmək, saxtalaşdırmaq; 4. ovsunlamaq, sehrləmək, cadulamaq, tilsimə salmaq; gözə gətirmək, nəzərə gətirmək
**bedew** [bɪ'dju:] *v* 1.islatmaq; *Her face was bedewed with tears Onun sifəti yaşla islanmışdı;* 2. yaş etmək, şeh salmaq; çiləmək, səpmək, sıçratmaq
**bedewed** [bɪ'dju:d] *adj* su damcıları ilə islanmış/isladılmış; **eyes ~ with tears** yaşla islanmış gözlər
**bedfellow** ['bed.felou] *n* 1. yataqyoldaşı, bir yataqda yatan adamlar; 2. *zaraf.* aşna, məşuqə; kəniz; arvad; 3. kompanyon, ortaq, şərik
**bedim** [bɪ'dɪm] *v* qaranlıqlaşdırmaq; torlaşdırmaq; dumanlandırmaq
**bedimmed** [bɪ'dɪmd] *adj* qaranlıqlaşdırılmış, torlaşdırılmış, dumanlaşdırılmış, torlaşmış; **eyes ~ with tears** yaşdan dumanlanmış / torlanmış gözlər
**bedizen** [bɪ'daɪzn] *v* əlvan / parlaq tərzdə bəzəmək; **~ed with flags** əlvan bayraqlarla bəzədilmiş; **to ~ with flags** əlvan bayraqlarla bəzəmək; **to ~ with jewels** daş-qaşla bəzəmək; **to ~ oneself** əlvan/ bər-bəzəkli geyinmək
**bedlam** ['bedləm] *n* 1. Bedləm *(Londonda ruhi xəstələr üçün xəstəxana)*; 2. dəlixana; 3. səs-küylü, çirkli yer / fəaliyyət
**bedlinen** ['bed.lɪnɪn] *n* yataq dəyişəyi
**bedmate** ['bedmeɪt] *n* 1. çarpayı yoldaşı, bir çarpayıda yatanlar; 2. ər, arvad, ər-arvad
**bedpan** ['bedpæn] *n* 1. ləyən *(xəstənin altına qoyulan qab)*; 2. metaldan hazırlanmış yataq qrelkası
**bedpost** ['bedpoust] *n* çarpayının ayağı;
◊ **in twinkling of ~** cəld, bir anda, ani, göz qırpınca, göz yumub açınca; **you, me and the ~** tam məxfi; *Öz aramızda (qalsın); Between you, me and the bedpost, I think he has been drinking again Öz aramızda qalsın/Öz aramızdır, mənə belə gəlir ki, o yenə də içir*
**bed-quilt** ['bedkwɪlt] *n* sırınmış/sırıqlı yorğan
**bedraggle** [bɪ'drægl] *v* çirkləndirmək, çirk sıçratmaq; çirkə batırmaq, ləkələmək, bulamaq *(çirkə)*
**bedraggled** [bɪ'drægld] *adj* çirklənmiş, ləkələnmiş, batmış, bulanmış; **~ skirt** çirklənmiş / ləkələnmiş yubka; **~ shirt** ləkələnmiş / bulanmış köynək
**bedrid** ['bedrɪd] *adj* 1. əldən düşmüş, zəif, halsız, taqətsiz; **~ argument** zəif dəlil / arqument / sübut; 2. = **bedridden**
**bedridden** ['bed.rɪdn] *adj* yataq dustağı olan, yatağa düşən, yataqdan qalxa bilməyən *(xəstəlikdən yaxud qocalıqdan); He is bedridden with / by flue O, qripdən yatağa düşüb*
**bedrock** ['bedrɔk] *n* 1. *geol.* əsas süxur; 2. qayanın əsası; 3. əsas prinsip/qayə, əsas, bazis; **to get down to/to reach ~** işin kökünü axtarıb tapmaq, işin mahiyyətinə varmaq; 4. son, axırıncı *(qiymətdə və s.)*; **~ price** axırıncı qiymət
**bedroom**[1] ['bedrum] *n* 1. yataq otağı; 2. cinsi əlaqə otağı
**bedroom**[2] ['bedrum] *adj:* **~ suit** yataq dəsti; **~ slippers** yataq otağında geyilən şap-şap/ başmaq; **~ scenes** seks səhnəsi; *That new film has*

*a lot of bedroom scenes O təzə filmdə çoxlu seks səhnəsi var*

**bedside[1]** ['bedsaɪd] *n* çarpayının yanı; **to sit at** *smb.'s* ~ bir kəsin çarpayısının yanında oturmaq, xəstə olan kəsə qulluq etmək; *She never left her son's bedside O, xəstə oğlunun yatağının yanından bir an aralanmadı*

**bedside[2]** [bedsaɪd] *adj:* ~ **rug** çarpayının qabağına salınan balaca xalça; ~ **table** çarpayının yanına qoyulan balaca miz/dolabça; ~ **literature** yatmazdan əvvəl yüngül oxunan ədəbiyyat; ~ **manner** xəstəyə yanaşma tərzi; həkimlik taktikası; ~ **note / chart** *tib.* xəstəlik haqqında məlumat, xəstəlik tarixi

**bed-sitter** [ˌbed'sɪtəʳ] *n* həm yaşamaq, həm də yatmaq üçün otaq

**bedsitting room** [ˌbed'sɪtɪŋrum] *n* = **bed-sitter**

**bedsocks** ['bedsɔks] *n pl* gecə geyilən qalın yun corab

**bedsore** ['bedsɔ:ʳ] *n* yataq yarası *(həmişə bir tərəfi üstə yatmaqdan bədənin bir yerinin sürtülməsi nəticəsində əmələ gələn yara)*

**bedspread** ['bedspred] *n* çarpayı örtüyü

**bedstead** ['bedsted] *n* çarpayı *(döşəksiz)*, çarpayının gövdəsi

**bedstraw** ['bedstrɔ:] *n bot.* qatıqotu

**bedtime** ['bedtaɪm] *n* yatmaq vaxtı; *My bedtime is 11 o'clock Mənim yatmaq vaxtım saat 11-dir; It's past bedtime Yatmaq vaxtı çoxdan keçib; It is long past your bedtime, children! Uşaqlar, sizin yatmaq vaxtınız çoxdan keçib!*

**bee[1]** [bi:] *n* **1.** arı, bal arısı; **female/queen** ~ beçəverən arı; **working** ~ işlək arı; **keeping of ~s** arıçılıq; **2.** *amer.* qonşulara kömək; birgə iş; **3.** müsabiqə, yarış; **spelling** ~ orfoqrafiyanı bilmək üzrə məktəblilər arasında aparılan müsabiqə; *Who won the spelling bee? Orfoqrafiya üzrə aparılan müsabiqədə kim qalib gəldi?*

**bee[2]** [bi:] *adj* arı; ~ **venom** arı zəhəri; ~ **plants** bal verən bitkilər; ~ **veil** arıdan qorunmaq üçün üzə geyilən örtük; ~ **escape** *k.t.* arı beçəsinin öz səbətini tərk etməsi;

◊ **busy as a** ~ çox məşğul; zəhmətkeş, zəhmətsevər; **to have ~s in the head** uydurmaçı olmaq, xəyalpərəst/xülyaçı olmaq

**beebread** ['bi:bred] *n bot.* tozcuq *(bitkilərdə erkək cinsiyyət hüceyrəsi)*

**beech** [bi:tʃ] *n* **1.** *bot.* fıstıq *(ağac)*; **2.** fıstıq oduncağı

**beechen** ['bi:tʃn] *adj* fıstıq

**beechnut** ['bi:tʃnʌt] *n* fıstıq *(meyvə)*

**beech-wheat** ['bi:tʃwi:t] *n bot.* qarabaşaq

**bee-eater** ['bi:ˌi:təʳ] *n zool.* arıyeyən *(quş)*

**beef[1]** [bi:f] *n* **1.** mal əti; **horse** ~ at əti; **2.** ətlik heyvan; **3.** ət cəmdəyi; **4.** şikayət, etiraz, narazılıq; *He's got a lot of beefs about his job O, işindən xeyli şikayət edir*

**beef[2]** [bi:f] *adj* ətlik; ~ **cattle** ətlik heyvan; ~ **raising** ətlik heyvandarlıq

**beef[3]** [bi:f] *v* şikayət etmək, şikayətlənmək; inildəmək; inləmək; deyinmək; *Stop beefing! Deyinməyi kəs!/kəsin!*

**beefcake** ['bi:fkeɪk] *n* atletik bədənli kişi şəkli

**beefeater** ['bi:fˌi:təʳ] *n* **1.** leyb-qvardiyaçı *(saray qvardiya üzvü)*; **2.** London qülləsinin gözətçi əsgəri; **3.** ətyeyən, ət yeyən adam

**beef-head** ['bi:fhed] *n kob.* malbaş, gic, küt, axmaq, korazehin, qanmaz, kütbeyin *(adam)*

**beefsteak** ['bi:fsteɪk] *n aşp.* bifşteks *(qızardılmış sümüksüz mal əti)*

**beef-tea** ['bi:fˈti:] *n* qatı ət suyu, bulyon

**beef-witted** ['bi:fˈwɪtɪd] *adj d.d.* axmaq, sarsaq, gic, səfeh, ağılsız, başı boş, yelbeyin

**beefy** ['bi:fi] *adj* **1.** yekə, zorba, çox iri, çox böyük *(adam haq.)*; möhkəm, qüvvətli; **2.** ətli; yağlı, kök

**bee-glue** ['bi:glu:] *n* arı yapışqanı *(arıların hasil etdiyi və səbətin ağzına yaxdıqları maddə)*

**beehive** ['bi:haɪv] *n* arı pətəyi/səbəti/təknəsi

**beehouse** ['bi:haus] *n* pətəklik; arıxana *(arıların quşlama yeri)*

**beekeeper** ['bi:ˌki:pəʳ] *n* arıçı, arıxana işçisi

**beekeeping** ['bi:ˌki:pɪŋ] *n* arıçılıq; arıçılıq təsərrüfatı

**bee-line** ['bi:ˈlaɪn] *n* **1.** *iki nöqtə arasında olan ən qısa məsafələn kəsə yol*; **2.** arı yolu *(arıların bal götürdükləri yerdən pətəyə qədər olan uçuş xətti)*;

◊ **to make/to follow/to take a ~ for** *smth.* bir şeyə/bir yerə tərəf cəld və birbaşa getmək / kəsə yolla getmək; *The hungry boy made a bee-line for his dinner Ac oğlan birbaşa nahar yeməyinə cumdu*

**bee-master** ['bi:ˌma:stəʳ] *n* = **beekeeper**

**been** [bi:n] **to be** *felinin pp forması*

**beer[1]** [bɪəʳ] *n* **1.** pivə; **2.** zəif alkoqollu içki; **ginger** ~ zəncəfil pivəsi

**beer[2]** [bɪəʳ] *adj* pivə; ~ **mug / bottle / glass** pivə kurujkası / butulkası / stəkanı;

◊ **small** ~ **1)** zəif pivə; **2)** mənasız / əhəmiyyətsiz şey; **to think no small ~ of oneself** özü haqqında yüksək fikirdə olmaq, özündən bədgüman olmaq

**beer-garden** ['bɪəˌga:dn] *n* açıq havada olan pivəxana

**beer-money** ['bɪəˌmʌnɪ] *n* pivə pulu

**beery** ['bɪərɪ] *adj* pivə; ~ **smell** pivə iyi

**bees-wax[1]** ['bi:zwæks] *n* arı mumu

**bees- wax[2]** ['bi:zwæks] *v* mumla sürtmək

**beet[1]** [bi:t] *n bot.* çuğundur, pazı; **red** ~ qırmızı çuğundur/pazı; **white/sugar** ~ ağ/şəkər çuğunduru

**beet[2]** [bi:t] *adj* çuğundur; ~ **sugar** çuğundur şəkəri/qəndi; ~ **digger** çuğundurçıxaran; ~ **harvester** çuğunduryığan maşın

**beetle[1]** ['bi:tl] *n* I **1.** böcək; **carpet** ~ xalça böcəyi; **2.** *d.d.* tarakan, mətbəxböcəyi;

◊ **blind as** ~ tamamilə kor

**beetle** ['bi:tl] *n* II **1.** toxac, döyəc; toxmaq; yekə ağac çəkic; **2.** *toxuc.* lifdidən maşın *(çətənə üçün)*;



◊ **to be between the ~ and the block** çəkiclə zindan arasında olmaq; çıxılmaz vəziyyətə düşmək

**beetle[2]** ['bi:tl] *v* **1.** döyəcləmək, döyəcləyib bərkitmək; toxaclamaq, toxaclayıb bərkitmək *(yolu və s.)*; **2.** tez / cəld çıxıb getmək; *After work we beetled off for a drink İşdən sonra biz tez çıxıb içməyə getdik; Beetle off! Rədd ol, Çıx get!*

**beetle-browed** ['bi:tlˌbraud] *adj* **1.** sallaqaş; ~ **man** sallaqaş kişi; **2.** qaşqabaqlı, qaraqabaq

**beetle-head** ['bi:tlhed] *n* axmaq, korazehin, qanmaz, kütbeyin *(adam)*

**bee-tree** ['bi:tri:] *n* ağac kötüyündən qayrılan / qayrılmış pətək

**beet-root[1]** ['bi:tru:t] *n* çuğundur, pazı

**beet-root[2]** ['bi:tru:t] *adj* çuğundur; ~ **soup** çuğundur şorbası, borş; **to turn as red as a** ~ pazı kimi qıpqırmızı qızarmaq; *The girl turned as red as a beet-root when they laughed at her Onlar qıza güləndə o, qıpqırmızı qızardı*

**bee-wine** ['bi:waɪn] *n* nektar *(bal şirəsi, bitkilərdən sızan şirə)*

**befall** [bɪ'fɔ:l] *v* *(pt* **befell** [bɪ'fel]*; pp* **befallen** [bɪ'fɔlən]*)* **1.** baş/üz vermək, vaqe olmaq; *What has fallen him? Ona nə olub? I fear some evil will befall Qorxuram ki, nəsə bir fəlakət baş versin;* **2.** *arx.* **(to)** yaraşmaq, uyğun gəlmək, münasib olmaq, yaramaq, əl vermək; dəxli / aidiyyəti olmaq

**befallen** [bɪ'fɔ:lən] **to befall** *felinin pp forması*

**befell** [bɪ'fel] **to befall** *felinin k. z. forması*

**befit** [bɪ'fɪt] *v* **(-tt-)** yaramaq, lazım/gərək/yararlı /müvafiq olmaq; yaraşmaq, uyğun / münasib olmaq, əl vermək, *Your behaviour doesn't befit you Sənin / Sizin hərəkətin / hərəkətiniz sənə / sizə yaraşmır*

**befitting** [bɪ'fɪtɪŋ] *adj* yarayan, uyğun gələn, müvafiq olan; **in a ~ way** müvafiq olaraq / şəkildə

**befog** [bɪ'fɔg] *v* pərdələmək, dumanlandırmaq

**befool** [bɪ'fu:l] *v* **1.** ələ salmaq, oynatmaq, aldatmaq, axmaq yerinə qoymaq; **2.** lağa qoymaq, rişxənd / istehza etmək

**before[1]** [bɪ'fɔ:ʳ] *adv* **1.** tez; qabaqca, əvvəlcə; daha tez, daha erkən; əvvəllər, keçmişdə, qabaqlar; *Come at five o'clock, not before Saat beşdə gəl/gəlin, tez yox; I have never been to London before Mən əvvəllər / qabaqlar Londonda olmamışam; You should have told me so before Sən/Siz gərək mənə əvvəlcə belə deyəydin / deyəydiniz; He fell silent, as before O, əvvəlki kimi susdu;* **2.** qabaqda, öndə, qarşıda; *There were trees before Qabaqda / Öndə / Qarşıda ağaclar vardı; He has gone on before O əvvəldən / qabaqcadan getmişdi;* **3.** öncə, əvvəl, qabaq; **a day** ~ bir gün əvvəl/öncə/qabaq; **the year** ~ bir il əvvəl/öncə / qabaq; **a moment** ~ bir an əvvəl/qabaq; *I spent last year in America and the year before in Spain Mən keçən il Amerikada, bir il əvvəl isə İspaniyada yaşadım*

**before[2]** [bɪ'fɔ:ʳ] *prep* **1.** kimi, -dək, əvvəl, öncə; *Come before six o'clock Saat altıya kimi/altıyadək gəl; I usually take a walk before dinner Mən adətən nahardan əvvəl/öncə gəzintiyə çıxıram;* ~ **breakfast** səhər yeməyindən əvvəl/öncə; ~ **Christ** İsanın (peyğəmbər) anadan olmasından öncə / əvvəl; *He came an hour before the time O, vaxtından bir saat əvvəl gəldi; Before answering the letter, he reread it twice Cavab vermədən əvvəl / öncə o, məktubu iki dəfə oxudu;* **the generations ~ us** bizdən əvvəlki nəsillər; **2.** qabağında, qarşısında, önündə; *I saw a path before me Mən qarşımda / qabağımda bir cığır gördüm; He sat just before me O düz mənim qarşımda / qabağımda oturdu;* ~ *smb's* **eyes** bir kəsin gözü qarşısında / qabağında; **3.** -a, -ə, -da, -də; *He appeared before the judge O, məhkəmə qarşısında dayandı; The question is before the meeting Məsələ iclasda müzakirə edilməlidir;* **4.** *Birləşmələrdə işlədilir:* **the day ~ yesterday** srağagün; ~ **long** tezliklə; ~ **everything else** hər şeydən əvvəl/ öncə; ~ **now** əvvəlcə, öncə, qabaqca; *It ought to have been done before now Bu gərək əvvəlcə / öncə / qabaqca ediləydi*

**before[3]** [bɪfɔ:ʳ] *conj* -dan, -dən, əvvəl/qabaq / öncə; *Put out the lights before you go to bed Yatmamışdan qabaq işıqları söndür / söndürün; He gave me a ring before leaving Getməzdən qabaq o mənə zəng çaldı / etdi; I must finish my work before I go home Mən evə getməzdən əvvəl/qabaq/öncə işimi qurtarmalıyam*

**beforehand** [bɪ'fɔ:hænd] *adv* qabaqcadan, əvvəlcədən, qabaqdan, irəlidən; **to pay rent** ~ ev kirayəsini qabaqcadan / əvvəlcədən ödəmək; **to make preparations** ~ əvvəldən/qabaqcadan hazırlıq görmək; **to be ~ in** *one's* **conclusions** vaxtından əvvəl nəticə çıxartmaq; *Let me know your plan beforehand Planın/Planınız haqqında mənə əvvəlcədən/qabaqcadan xəbər ver/verin; Don't be beforehand in making up your mind Əvvəlcədən fikir söyləməyə tələsmə / tələsməyin;*

◊ **to be ~ with the world** dövlətli/ varlı olmaq, yaxşı təmin olunmaq

**befoul** [bɪ'faul] *v* **1.** çirklətmək, kirlətmək, bulamaq, ləkələmək, batırmaq; **2.** murdarlamaq; təhqir etmək

**befriend** [bɪ'frend] *v* kömək etmək, imkan yaratmaq, dostcasına münasibət göstərmək; **to ~ one's self** öz qeydinə qalmaq, özündən muğayat olmaq

**befringe** [bɪ'frɪndʒ] *v* haşiyələmək, haşiyə çəkmək; saçaq tikmək, saçaqla haşiyələmək

**befuddle** [bɪ'fʌdl] *v* **1.** keflədirmək, sərxoş/məst etmək; **2.** bihuş etmək, beynini zəhərləmək; **3.** yolundan çıxartmaq/azdırmaq

**beg** [beg] *v* **(-gg-) 1.** istəmək; dilənmək; **to** ~

money of *s.o.* bir kəsdən pul istəmək; to ~ bread çörək istəmək/dilənmək; to ~ *s.o.* to do *smth.* bir kəsdən bir şey etməyi xahiş etmək; *He begged (for) money from the people in the street O, küçədə adamlardan pul dilənirdi;* 2. xahiş etmək, rica etmək, yalvarmaq; *I beg of you not to get into danger Səndən / Sizdən xahiş edirəm özünü/özünüzü təhlükəyə salmayasan/salmayasınız;* **to ~ for help** kömək istəmək, kömək üçün yalvarmaq; **to ~ for mercy** aman istəmək, aman üçün yalvarmaq; **to ~ from door to door** qapı-qapı dilənmək; **to ~ one's bread** dilənib dolanmaq, dilənməklə yaşamaq; *I beg to say İcazə verin deyim;*

◊ **to ~ the question** 1) əsassız olaraq təsdiq etmək; 2) əsas məsələdən boyun qaçırmaq; **to ~ *smb.* for a fool** bir kəsi axmaq yerinə qoymaq, bir kəsi axmaq hesab etmək

**begad** [bɪˈgæd] *inter d.d. Allah haqqı! Allaha and olsun!*

**began** [bɪˈgæn] **to begin** *felinin pt forması*

**beget** [bɪˈget] *v (pt* **begat, begot**; *pp* **beggoten**); 1. əkmək *(uşaq haq.)*, ata olmaq; *Abraham begat/begot Isaac (Bibliya) İbrahim İsanı əkmişdi, İbrahim İsanın atası olmuşdu;* 2. doğurmaq, yaratmaq; törətmək; *Hunger begets crime Aclıq cinayət törədir; War begets misery Müharibə əzab-əziyyət doğurur / törədir / yaradır*

**begetter** [bɪˈgetər] *n* 1. valideyn; 2. *məc.* günahkar; doğuran, yaranmasına səbəb olan

**beggar[1]** [ˈbegər] *n* 1. dilənçi; yolçu; 2. kasıb, yoxsul; 3. *zaraf.* oğlan, gənc, cavan; kələkbaz, hiyləgər, cüvəllağı; **little ~s** balaca kələkbazlar/oğlanlar *(uşaqlar və s. haq.)*; *He is a good-hearted beggar O, ürəyiaçıq/mehriban oğlandır;* **poor ~** yazıq, fağır, biçarə, zavallı; **insolent ~** həyasız, sırtıq *(adam)*; **lucky ~** bəxtəvər, bəxtiyar *(adam)*; **unfortunate ~** bəxtsiz / talesiz adam;

◊ **a ~ on horseback** bambılı, cırtqoz; *Beggars cannot /must not be choosers at. söz. Kasıblar seçmək imkanına malik olmur* ≅ *Bəy verən atın dişinə baxmazlar*

**beggar[2]** [ˈbegər] *v* 1. yoxsullaşdırmaq, kasıblatmaq, dilənçi vəziyyətinə salmaq; **to ~ oneself** özünü var-yoxdan çıxartmaq, özünü dilənçi halına salmaq, dilənçiləşmək; *Conscience beggars any man that keeps it (Shakespeare) Vicdan hər bir adamı kasıb salar, Vicdanlı adam dövlətli ola bilməz;* 2. ötmək, ötüb keçmək, üstün olmaq; *It beggars all description Bu heç bir təsvirə gəlmir;* **to ~ compare** müqayisəyə gəlməmək; 3. məcbur etmək, vadar etmək; **to ~ *smb.* into submission** bir kəsi tabe olmağa məcbur / vadar etmək

**beggardom** [ˈbegədəm] *n* 1. *top.i* dilənçilər; 2. dilənçilik; son dərəcə yoxsulluq / kasıblıq

**beggarhood** [ˈbegəhud] *n* 1. yoxsulluq, kasıblıq, səfalət; 2. dilənçilər; dilənçilik

**beggarism** [ˈbegərɪzm] *n* 1. dilənçilik; son dərəcə yoxsulluq / kasıblıq; 2. yoxsulluq, kasıblıq, səfalət

**beggarliness** [ˈbegəlɪnɪs] *n* 1. kasıblıq, yoxsulluq; 2. dilənçi görkəmi; üst-başı tökülmüş / dağılmış

**beggarly[1]** [ˈbegəlɪ] *adj* 1. dilənçi; **~ life** dilənçi həyatı; **~ hovel** dilənçi daxması/koması; 2. miskin, dəyərsiz, yararsız; əsassız; cüzi; **~ arguments** dəyərsiz/yararsız/əsassız dəlillər; **~ wage** cüzi / çox az əmək haqqı / maaş; 3. alçaq, yaramaz, əclaf, rəzil; **~ doings** alçaq / yaramaz hərəkətlər

**beggarly[2]** [ˈbegəlɪ] *adv* dilənçi kimi/sayağı

**beggary[1]** [ˈbegərɪ] *n* 1. yoxsulluq, kasıblıq, səfalət; ehtiyac; **to reduce to ~** dilənçi halına/kökünə salmaq; 2. *top.i* dilənçilər; 3. dilənçilik, son dərəcə yoxsulluq

**begging** [ˈbegɪŋ] *n* dilənçilik, son dərəcə yoxsulluq; **to go a ~** dilənmək, dilənçilik etmək

**begin** [bɪˈgɪn] *v (pt* **began** [bɪˈgæn]; *pp* **begun** [bɪˈgʌn]) 1. başlamaq; başlanmaq; *He began studying /to study English O, ingilis dilini öyrənməyə başladı; He began the meeting O, iclası başladı / açdı; The child began to cry Uşaq ağlamağa başladı; The rain began Yağış başladı; The meeting will begin at five İclas saat beşdə başlayacaq;*

◊ **to ~ with** əvvəla, hər şeydən əvvəl/ öncə; *To begin with, I don't know him Əvvəla / Hər şeydən öncə mən onu tanımıram;* **to ~ the world** müstəqil həyata/həyat sürməyə başlamaq; *Well begun is half done at. söz. Yaxşı başlanğıc, işin yarısı deməkdir*

**beginner** [bɪˈgɪnər] *n* təcrübəsiz adam; başlayan; **English for ~s** başlayanlar üçün ingilis dili dərsliyi

**beginning** [bɪˈgɪnɪŋ] *n* 1. əvvəl, başlanğıc; baş; **to read a book from the ~ to end** kitabı başdan/əvvəldən axıra kimi oxumaq; *He knows the subject from beginning to end O, fənni əvvəldən axıra kimi bilir, O, fənni dərindən bilir;* 2. başlanğıc; mənbə; **the ~s of English poetry** ingilis poeziyasının başlanğıcı / mənbəyi;

◊ *A good beginning is half the battle at. söz. Yaxşı başlanğıc işin yarısı deməkdir; A bad beginning makes a bad ending at. söz. Pis başlanğıc pis nəticə verir*

**begird** [bɪˈgə:d] *v (pt* **begirt**; *pp* **begirded, begirt**) (**with**) qurşamaq, bağlamaq *(qayış)*, dolamaq; dövrələmək, mühasirəyə almaq, əhatə etmək

**begirdle** [bɪˈgə:dl] *v* qurşamaq; dolamaq; dövrələmək, mühasirəyə almaq

**begirt** [bɪˈgə:t] **to begird** *felinin pt forması*

**begloom** [bɪˈglu:m] *v* kədərləndirmək, qəmləndirmək, ovqatını təlx etmək, əhvalını pozmaq, qanını qaraltmaq, pərt etmək



**beguile** [bɪˈgaɪl] *v* 1. aldatmaq; dilə tutmaq, tovlamaq, aldadaraq cəlb etmək; **to ~ *smb.* into doing *smth.*** bir kəsi aldadaraq bir işi görməyə cəlb etmək; *They beguiled the man into giving them his money Onlar kişini tovlayaraq pulunu aldılar;* 2. heyran / məftun / valeh etmək, tamahlandırmaq, yoldan çıxartmaq; *Her voice and eyes beguiled me Onun səsi və gözləri məni heyran / məftun etdi*

**begun** [bɪˈgʌn] **to begin** *felinin pp forması*

**behalf** [bɪˈha:f] *n* 1.: **on ~ of *smb.*, on *smb.'s* ~** bir kəsin adından, bir kəsin tərəfindən; *I am speaking on my husband's behalf / on behalf of my husband Mən ərimin adından danışıram;* **to speak on ~ of all progressive men and women** bütün tərəqqipərvər kişi və qadınlar adından danışmaq; 2.: **in ~ of** xeyrinə; **in my / his ~** mənim / onun xeyrinə; **in ~ of oppressed peoples** əzilən xalqların xeyrinə; **to speak in ~ of *smb.'s* case** bir kəsin xeyrinə danışmaq; **to plead in ~ of *smb.'s* case** bir kəsi müdafiə etmək üçün çıxış etmək

**behave** [bɪˈheɪv] *v* 1. özünü aparmaq; rəftar etmək, davranmaq; **to ~ well/badly/courageously** yaxşı/pis/cəsarətlə davranmaq, özünü yaxşı / pis / cəsarətli aparmaq; **to ~ with gallantry** özünü alicənabcasına aparmaq; **to ~ with insolence** vicdansızcasına hərəkət etmək; **to ~ like a man of sense** ağıllı adam kimi hərəkət etmək; **to ~ like a hog** özünü donuz kimi aparmaq, donuz kimi hərəkət etmək; 2. özünü yaxşı/ləyaqətli aparmaq, ləyaqətlə davranmaq/hərəkət etmək; *Behave yourself! Özünü/Özünüzü yaxşı apar/aparın!;* 3. dəqiq işləmək; *How is your new car behaving Sənin/Sizin təzə maşının /maşınınız necə işləyir?;* **to ~ to, to ~ toward** münasibət göstərmək, hərəkət etmək *(bir kəsə qarşı)*

**behaviour** [bɪˈheɪvjər] *n* 1. əxlaq; rəftar, hərəkət, davranış; **good/bad/courageous ~** yaxşı/pis/cəsarətli davranış; **ill ~** çirkin hərəkət; **a guide to correct ~** davranış mədəniyyəti üzrə təlimat / göstəriş; *The children were on their best behaviour Uşaqlar özlərini çox yaxşı aparırdılar;* **to be on *one's* best ~** özünü nümunəvi aparmaq; **to be of good ~** özünü yaxşı aparmaq, yaxşı davranmaq; 2. nümunəvi əxlaq / davranış; tərbiyə, ədəb, nəzakət; **to be on / upon *one's* ~** mətanət / səbr / dözüm / təmkin nümayiş etdirmək; 3. münasibət, müraciət; **her gentle ~ to the children** onun uşaqlara qarşı yumşaq/ nəzakətli münasibəti

**behaviourism** [bɪˈheɪvjərɪzm] *n psix.* bixeviorizm *(əqlin elmi cəhətdən öyrənilməsində şəxsin yalnız davranış və fikri vəziyyətinə əsaslanan nəzəriyyə)*

**behaviourist** [bɪˈheɪvjərɪst] *n* bixeviorizm tərəfdarı

**behead** [bɪˈhed] *v* başını kəsmək; boynunu vurmaq

**beheading** [bɪˈhedɪŋ] *n* başını kəsmə, boynunu vurma

**beheld** [bɪˈheld] **to behold** *felinin pt, pp forması*

**behest** [bɪˈhest] *n şair.* 1. hökm, fərman, əmr, buyruq; 2. vəsiyyət

**behind[1]** [bɪˈhaɪnd] *n* sağrı; göt; *I gave him a good swift kick in the behind Mən onun götünə cəld bir təpik vurdum*

**behind[2]** [bɪˈhaɪnd] *adv* 1. arxasınca, dalınca; arxada, dalda; **to run ~** arxasınca/dalınca qaçmaq; *The dog was running behind İt arxada / dalda qaçırdı;* **the person ~** arxadakı adam, **to leave ~** arxada qoymaq, ötüb keçmək; **to leave *smth.* ~** bir şeyi unutmaq; *My school-years are far behind Mənim məktəb illərim çoxdan arxada qalıb / ötüb gedib;* 2. geri, arxaya; **to look ~** arxaya/geriyə baxmaq; boylanmaq; *Don't look behind Arxaya / Geriyə baxma / baxmayın, Geriyə boylanma / boylanmayın;* **to be ~** geri qalmaq; gecikmək; **to be ~ in/with *one's* studies** təhsildə geri qalmaq; **to be in / with *one's* work** işində geri qalmaq; **special classes for children who are ~** təhsildə geri qalan uşaqlar üçün xüsusi kurslar/siniflər; **to be ~ in score** *id.* hesabda geri qalmaq; *The clock runs behind Saat geri qalır; The train runs behind Qatar gecikir*

**behind[3]** [bɪˈhaɪnd] *prep* arxada, arxasına, arxasınca, dalında; **to be ~ of *smth.*** bir şeyin dalında/arxasında olmaq; *The house is behind the mountain Ev dağın arxasındadır / dalındadır; He hid behind the bushes O, kol-kosun arxasında/dalında gizləndi; I'll hide behind the door Mən qapının arxasında gizlənəcəm; There is smth. strange behind that remark Bu fikrin / eyhamın arxasında nəsə bir sirli şey var; What is behind all this? Bunların arxasında nə durur?; The sun went behind the clouds Günəş buludların arxasına keçdi/çəkildi; Look behind the wall Divarın arxasına bax/baxın; He has smb. behind him məc. Onun arxasında kimsə var, Onu kimsə müdafiə edir;* 2. dala, geri; **to be ~ the schedule** plandan geri qalmaq; *He is behind the plan O, plandan geri/dala qalır;* **to be ~ *smb.* in knowledge** bilikdə bir kəsdən geri qalmaq; 3. sonra: *He left three children behind him O, özündən sonra üç uşaq qoyub (getdi);* **~ *smb.'s* back** kiminsə xəbəri olmadan, kimdənsə gizli/gizlin; **~ the time** gec; *He is behind the usual time today O bu gün gecikir;* **~ the times** geri qalmış, köhnəlmiş

**behindhand[1]** [bɪˈhaɪndhænd] *adj* 1. borcu olan, borca düşən; **~ in rent** ev kirayəsində borcu olan; 2. gecikən, gecikmiş; geri qalmış, geri qalan; **~ with answer** cavab verməkdə gecikmiş; **to be ~ in *one's* work** işdə geri qalmaq / geriləmək;

◊ **to be ~ with the world** 1) həyatdan geri qalmaq, həyatla ayaqlaşmamaq; 2) işi / bəxti gətirməmək

**behindhand[2]** [bɪ'haɪndhænd] *adv* 1. gec; *You are behindhand with the rent this month Bu ay sən/siz ev kirayəsini gecikdirmisən / gecikdirmisiniz;* 2. ləng; *She was never behindhand in offering advice O məsləhət verməkdə heç vaxt ləngiməzdi;* 3. əvvəlki / köhnə tarixlə

**behold** [bɪ'hould] *v arx.* (*pt, pp* **beheld**) *şair.* 1. baxmaq, müşahidə etmək; 2. görmək

**beholden** [bɪ'houldn] *adj arx.* borclu, borclu olan; **to be ~ to *smb.* for *smth.*** bir şey üçün bir kəsə borclu olmaq; *I like to do things for myself and not feel beholden to anybody Mən işimi özüm görməyi və heç kimə borclu olmamağı sevirəm*

**beholder** [bɪ'houldəʳ] *n şair.* tamaşaçı, şahid, müşahidəçi; nəzarətçi;

◊ *Beauty is in the eye of the beholder at. söz. Məhəbbət sevənin gözündə olur;* ≅ *Könül sevən göyçək olar*

**behoof** [bɪ'hu:f] *n* xeyir, gəlir, mənfəət; **in / for/to his ~** onun xeyrinə

**behoove** [bɪ'hu:v] *v* = **behove**

**behove** [bɪ'houv] *v* lazım/gərək/vacib olmaq; *(adətən **it** şəxssiz əvəzliyi ilə işlənir) It does not behove you to act in this manner Sən / Siz gərək belə hərəkət etməyəsən /etməyəsiniz; It behoves you to work harder if you want to succeed Nailiyyət qazanmaq üçün sənə/sizə daha ciddi işləmək gərəkdir / lazımdır*

**beige[1]** [beɪʒ] *n* 1. berj *(sarıya çalan açıq qəhvəyi rəng)*; 2. boyanmamış yundan toxunmuş parça

**beige[2]** [beɪʒ] *adj* berj rəngli *(sarıya çalan açıq-qəhvəyi rəngli)*

**being[1]** [bi:ɪŋ] *n* 1. varlıq, mövcudiyyət, həyat, yaşayış, var /mövcud olma; dirilik; **to come into /in ~** yaranmaq, həyata gəlmək; **to call/to bring *smth.* into ~** bir şeyi yaratmaq, həyata gətirmək, bir şeyə həyat vermək; **Southern Caucasian states recently come into ~** yaxınlarda yaranmış Cənubi Qafqaz dövlətləri; *What is the real nature of being? Varlığın əsl/real təbiəti nədir? The news shook me to the very roots of my being Bu xəbər mənim bütün varlığımı sarsıtdı; Love of life was the very core of his being Həyata məhəbbət/Həyat məhəbbəti onun varlığının mənası idi;* 2. *(canlı)* varlıq; **a living ~** bəşəriyyət; **human ~s** insanlar, adamlar; 3. olma; *His being here shouldn't bother you Onun burada olması səni/sizi narahat etməməlidir;*

◊ **the Supreme Being** *din.* Ali varlıq, *(Allah haq.); As God is in being Allaha and olsun! Vallah!*

**being[2]** [bi:ŋ] *adj* hazırki, indiki, mövcud olan; **the time ~** hazırki / indiki zaman; **for the time ~** hələlik; *Let's do it just for the time being Gəl/Gəlin hələlik bunu edək*

**bejewel** [bɪ'dʒu:ɪl] *v* (-ll-) daş-qaşla bəzəmək

**bejewelled** [bɪ'dʒu:əld] *adj* daş-qaşla bəzədilmiş

**belabour** [bɪ'leɪbəʳ] *v* 1. kötəkləmək, döymək, əzişdirmək; **to ~ with a stick** ağacla döymək /əzişdirmək/döyəcləmək; 2. danlaq altında qoymaq, danlaq yağdırmaq; 3. zəhmət çəkmək, işləmək, əmək sərf etmək

**belate** [bɪ'leɪt] *v* gecikdirmək, yubatmaq, ləngitmək

**belated** [bɪ'leɪtɪd] *adj* gecikmiş, yubadılmış, ləngidilmiş; **~ excuse** gecikmiş üzr / üzrxahlıq; **~ confession** gecikmiş etiraf

**belatedly** [bɪ'leɪtɪdlɪ] *adv* gec; *The letter arrived belatedly Məktub gec gəldi/çatdı*

**belay[1]** [bɪ'leɪ] *n* 1. qoruma, mühafizə etmə; qorunma, mühafizə edilmə, mühafizə; 2. təminat; **positive ~** etibarlı təminat; **poor ~** pis / zəif / etibarsız təminat

**belay[2]** [bɪ'leɪ] *v* (*pt* **belayed**; *pp* **belaid**) 1. *dən.* kanatla /burazla bağlamaq *(gəmini)*; 2. burmaq, burub bərkitmək *(ipi, burazı)*; *Belay the line! dən. (komanda) Burazı burub bərkit!/bərkidin!;* 3. *dən. hərb. Belay that! (komanda) 1) Olmadı! 2) d.d. Bəsdir! Dayan!*

**belch[1]** [beltʃ] *n* 1. gəyirmə, gəyirti; **to give a loud ~** ucadan gəyirmək; *Everyone turned round when a loud belch came from the end of the room Otağın axırından gələn uca gəyirti səsinə hamı geri boylandı;* 2. püskürmə *(tüstü və s.)*

**belch[2]** [beltʃ] *v* 1. gəyirmək; 2. qusmaq; 3. **(out, forth)** püskürmək; *Chimneys belch (out) smoke Bacalar tüstü püskürür*

**beldam** ['beldəm] *n* 1. küpəgirən qarı, cadugər qarı; əcinnə; 2. qoca arvad; qarı

**beleaguer** [bɪ'li:gəʳ] *v* mühasirəyə almaq, mühasirə etmək, əhatə etmək, dövrələmək; **to ~ a city** şəhəri mühasirəyə almaq

**beleaguered** [bɪ'li:gəd] *adj* 1. mühasirəyə alınmış, mühasirə edilmiş; **a ~ city** mühasirəyə alınmış şəhər; 2. daima narahatçılıq / təlaş keçirən; **~ parents** daima təlaş keçirən valideynlər

**belfry** ['belfrɪ] *n* 1. zəng qülləsi *(kilsədə)*; 2. bürc, qüllə; 3. *k.t.* anbar, dam, mərək

**Belgian[1]** ['beldʒən] *n* belçikalı

**Belgian[2]** [beldʒən] *adj* belçika

**belie** [bɪ'laɪ] *v* 1. yalan təsəvvür yaratmaq; ört-basdır etmək; gizlətmək; *Appearance belies him Xarici görkəmi onun haqqında yalan təsəvvür yaradır; Her smile belied her real feelings of displeasure Təbəssümü onun əsl narazılıq hisslərini ört-basdır etdi/gizlətdi;* 2. üstünü açmaq, aşkara çıxartmaq, ifşa etmək; inkar etmək; zidd olmaq; *His acts belie his words Onun hərəkətləri sözlərini inkar edir, Onun hərəkətləri sözləri ilə ziddiyyət təşkil edir;* **to ~ oneself** özünü inkar etmək, özünə qarşı çıxmaq; 3. doğrultmamaq *(ümidi və s.)*; *The poor sales of the product belied our hopes Məhsulun*



*zəif satışı bizim ümidimizi doğrultmadı;* 4. əl çəkmək, uzaqlaşmaq, üz döndərmək; **to ~ *one's* principles** öz prinsipindən əl çəkmək; **to ~ *one's* faith** öz inamından üz döndərmək / əl çəkmək

**belief** [bɪ'li:f] *n* 1. inam, etiqad; **beyond / past ~** inanılmayacaq dərəcədə, son dərəcə, fövqəladə; **hard of ~** heç kəsə inanmayan / etibar etməyən, hər şeydən şübhələnən; **Light of ~** sadəlövh, sadədil, hər şeyə inanan; **unworthy of ~** inama layiq olmayan *(şayiə və s. haq.)*; *I haven't much belief in his honesty Mən onun səmimiyyətinə o qədər də inanmıram;* 2. məslək, əqidə, etiqad; **a man of strong ~s** möhkəm əqidəli / məsləkli adam; 3. inanma, etiqad etmə; **~ in God** Allaha inanma / etiqad etmə; **~ in afterlife** o dünyaya inanma; **superstitious ~s** mövhumat, xurafat; **heathen ~s** bütpərəstlik inamı / etiqadı; 4. *d.d.* fikir, rəy; *It is my belief that... Mənim fikrim / rəyim belədir ki...*

**believable** [bɪ'li:vəbl] *adj* inanıla bilən, mümkün ola bilən, ağlabatan; ağılkəsən, inanılacaq

**believably** [bɪ'li:vəblɪ] *adv* inandırıcı, inandırıcı tərzdə/surətdə, inanılacaq bir tərzdə

**believe** [bɪ'li:v] *v* 1. inanmaq; **to ~ a rumour/a lie** şayiəyə/yalana inanmaq; *I believe you Mən sənə/sizə inanıram; I believe what she says Mən onun dediyinə inanıram;* **to ~ someone** bir kəsə inanmaq /etibar etmək; **to ~ in God** Allaha inanmaq; **to ~ *smb.* on his word** bir kəsin sözünə inanmaq; *I believe in you Mən sənə /sizə inanıram;* 2. hesab etmək; zənn etmək, sanmaq, güman/mülahizə etmək; *I believe (that) you are right Mən zənn edirəm ki, sən/siz haqlısan/haqlısınız; I believe (that) you are wrong Mən zənn edirəm ki, sən/siz haqlı deyilsən/deyilsiniz; I believe we have much time Mən güman edirəm ki, bizim vaxtımız çoxdur; People believed the earth to be flat İnsanlar yerin yastı olduğunu zənn/güman edirdilər; I believe so Məncə elədir; Doğrudur, Düzdür; -Will they finish the work in time? -I believe so, I believe not -Onlar işi vaxtında qurtaracaqlarmı? -Yəqin ki, hə, Yəqin ki, yox; I believe him to be alive Zənn edirəm ki,/Yəqin ki, / Güman ki, o sağdır; He is believed to be in London Zənn edirlər ki,/Güman edirlər ki, o, Londondadır, Deyirlər ki, o, Londondadır; We believe him to be the man for the job Biz hesab edirik ki, o, bu iş üçün yararlıdır/ münasibdir; Let's believe that we are pirates Gəlin belə hesab edək ki, biz quldurug (xüs. uşaq oyunlarında)*

**believer** [bɪ'li:vəʳ] *n* 1. *din.* mömin, Allaha inanan, dindar; 2. **(in)** inanan *(bir şeyə)*; *He is believer in fresh air as a cure for illness O, təmiz havanın xəstəliyi müalicə edəcəyinə inanandır*

**belike** [bɪ'laɪk] *adv* ehtimal (ki), yəqin (ki), güman (ki), ola bilsin (ki), görünür (ki)

**belittle** [bɪ'lɪtl] *v* azaltmaq, əskiltmək; alçaltmaq, hörmətdən / qiymətdən salmaq; kiçiltmək; **to ~ *smb.'s* accomplishments** bir kəsin qədir-qiymətini azaltmaq; **to feel ~d in the presence of *smb.*** bir kəsin qarşısında alçaldılmasını hiss etmək; *Don't belittle yourself! Özünü /Özünüzü alçaltma!/alçaltmayın!*

**bell[1]** [bel] *n* 1. zəng; zınqırov; qumrov; **Tom ~** böyük zəng; **passing ~** dəfn zəngi; 2. zəng səsi; **to answer the ~** zəng səsinə qapını açmaq; *There is the bell! Qapının zəngini çalırlar!;* 3. kurant, qüllə saatı; **a chime of ~s** qüllə saatının səsi / vurması; 4. *dən.* yarım saat vaxt; 5. zəngvarı əşya; 6. *bot.* zəngçiçəyi;

◊ **to bear the ~** 1) birincilik qazanmaq; priz almaq; 2) birinci getmək; başçı olmaq; **to carry away the ~** birinci priz almaq; **to lose the ~** məğlub olmaq; **to ring the ~s** qələbəni təntənə ilə bayram etmək

**bell[2]** [bel] *v* zəng asmaq; zınqırovla bəzəmək, zınqırov düzmək, zınqırovla haşiyələmək;

◊ **to ~ the cat** cəsarət etmək; təhlükəli işdə təşəbbüsü öz üzərinə götürmək, özünü zərbə altında qoymaq

**belladonna** [.belə'dɔnə] *n bot.* 1. xanımotu; 2. *əcz.* xanımotundan hazırlanmış dərman

**belladonna lily** [.belə'dɔnə'lɪlɪ] *n bot.* amarillis *(qəşəng gülləri olan soğanlı bəzək bitkisi)*

**bell-bottoms** ['bel.bɔtəmz] *n* klyoş şalvar

**bell-boy** ['belbɔɪ] *n* koridor xidmətçisi *(mehmanxanada bir neçə nömrəyə xidmət edən xidmətçi)*

**belle** [bel] *n* gözəl, gözəl qız/qadın; dilbər; **the ~ of the ball** balın *(rəqs gecəsinin)* gözəli; **southern ~** *amer.* cənub gözəli

**belles-lettres** ['bel'letr] *n fr.* bədii ədəbiyyat; belletristika *(nəsrlə yazılmış bədii ədəbiyyat: roman, hekayə)*

**bellflower** ['bel.flauəʳ] *n bot.* zəngçiçəyi

**bellicose** ['belɪkous] *adj* döyüşkən, mübariz, davakar; təcavüzkar; **~ statement** davakar bəyanat; **~ tribe** davakar qəbilə; dalaşqan, davakar; **~ boy** dalaşqan/davakar oğlan

**bellicosity** [.belɪ'kɔsɪtɪ] *n* davakarlıq, dalaşqanlıq

**bellied** ['belɪd] *adj* qarnıyoğun, yekəqarın; qarınlı; şişman; **a ~ man** yekəqarın kişi

**-bellied** [-'belɪd] *mürəkkəb sözlərin tərkib hissəsi:* big-**bellied**, round-**bellied** yekəqarın

**belligerancy** [bɪ'lɪdʒərənsɪ] *n* = **belligerency**

**belligerence** [bɪ'lɪdʒərəns] *n* 1. davakarlıq; cəngavərlik; 2. müharibə vəziyyəti

**belligerency** [bɪ'lɪdʒərənsɪ] *n* 1. müharibə vəziyyəti; 2. davakarlıq, dalaşqanlıq; *I don't like his belligerency Mən onun davakarlığını sevmirəm*

**belligerent[1]** [bɪ'lɪdʒərənt] *n* 1. müharibə aparan tərəflər; **the ~s** müharibə vəziyyətində olan dövlətlər; 2. *zaraf.* dalaşmada/savaşmada iştirak edən, dalaşan adam

**belligerent²** [bɪˈlɪdʒərənt] *adj* **1.** müharibə vəziyyətində olan, müharibə aparan; **~ powers** müharibə aparan dövlətlər; **accessary /principal ~** müharibə aparan ikinci dərəcəli/əsas tərəflər; **~ rights** müharibə aparan tərəflərin hüquqları; **2.** davakar, mürtəce; hədələyici; **to speak in a ~ tone** hədələyici tonla danışmaq; **~ language** davakar danışıq; *I don't like your belligerent language, Tom. Let's talk calmly Tom, mən sənin/sizin davakar danışığını/danışığınızı xoşlamıram. Gəl/Gəlin sakit danışaq*

**bellow¹** [ˈbelou] *n* **1.** böyürmə, böyürtü *(heyvanlar haq.)*; **2.** *məc.* bağırtı, gurultu; uğultu; fəryad, nalə, şivən, inilti; **the deafening ~ of the sea** dənizin qulaqbatırıcı gurultusu; **the ~ of the cannon** topun gurultusu; **the ~ of the storm** tufanın gurultusu / uğultusu; **the ~ of a wounded man** yaralanmış / yaralı adamın fəryadı / naləsi / iniltisi

**bellow²** [ˈbelou] *v* **1.** böyürmək; qışqırmaq, bağırmaq; **to ~ like a bull** buğa kimi böyürmək; **to ~ (out) with pain** ağrıdan qışqırmaq / bağırmaq; **to ~ (out) with excitement** həyəcandan qışqırmaq/bağırmaq; **2.** *məc.* gurlamaq, uğuldamaq; *The wind bellowed in the night Tufan gecə uğuldayırdı; The boy bellowed even before the dentist had started Dentist başlamamış oğlan bağırdı/qışqırdı;* **3.** oxumaq *(mahnı)*, bərkdən və acıqlı qışqırmaq; *They bellowed out a drinking song Onlar kefli halda ucadan mahnı oxudular*

**bellows** [ˈbelouz] *n pl* **1.** körük; **2.** *tex.* büzməli/qat-qat membran; **3.** *d.y.* qarmonika *(vaqonlar arasında olan qat-qat keçid örtüyü)*; bəzi fotoaparatlarda onun qat-qat olan hissəsi; **4.** tuluq *(nəfəsli musiqi alətində)*

**bell-ringer** [ˈbel.rɪŋəʳ] *n* zəngçi, zəngçalan *(kilsədə)*

**bell-tower** [ˈbel.tauəʳ] *n* zəng qülləsi *(kilsədə)*

**bell-wether** [ˈbel.weðəʳ] *n* sürünün qabağında gedən qoyun

**belly** [ˈbelɪ] *n* **1.** qarın; **the lower ~** qarnın aşağı hissəsi; **to crawl on *one's* ~ 1)** qarnı üstə sürünmək; **2)** *məc.* yaltaqlıq etmək, yaltaqlanmaq, alçalmaq; **with an empty ~** ac qarnıla; **on an empty ~** acqarına; **to have a full ~** doyunca yemək, tox olmaq; **2.** *anat.* qarıncıq *(həşəratlarda və s.)*; *The belly is not filled with fair words at. söz. Gözəl sözlər adamı doyuzdurmaz; ≅ Halva-halva deməklə ağız şirin olmaz*

**belly** [ˈbelɪ] *v* **1.** doldurmaq *(hava ilə)*, üfürüb doldurmaq; **2.** doldurulmaq *(hava ilə)*, üfürülüb doldurulmaq

**belly-ache¹** [ˈbelɪeɪk] *n* **1.** qarınağrısı, qarında olan ağrı; **2.** şikayət, narazılıq; *I'm sick of listening to your belly-aches Mən sənin/sizin şikayətlərinə/şikayətlərinizə qulaq asmaqdan təngə gəlmişəm*

**belly-ache²** [ˈbelɪeɪk] *v* şikayət etmək, inildəmək, zarıldamaq; ağlayıb-sısqamaq; *Stop belly-aching and get on with your job! Şikayəti kəs / kəsin, işinlə / işinizlə məşğul ol / olun!*

**belly-band** [ˈbelɪbænd] *n* **1.** tapqır, qarınaltı; **2.** bandaj *(sarğı, kəmər)*

**belly-dance** [ˈbelɪdʌns] *n* göbəkatma *(rəqs növü)*

**belly-dancer** [ˈbelɪdʌnsəʳ] *n* göbəkatan rəqqasə

**bellyful** [ˈbelɪfl] *n* **1.** toxluq; **to have a ~** doyana qədər yemək, tox olmaq; **2.** *məc.* doyma, təngə gəlmə

**belly-gut** [ˈbelɪgʌt] *n* qarınqulu, acgöz

**belong** [bɪˈlɔŋ] *v* **(to)** aid olmaq, məxsus olmaq; mənsub olmaq; -dır, -dir, -dur, -dür; *This dictionary/book/pen/pencil, etc belongs to me Bu lüğət/kitab/qələm/ karandaş və s. mənə məxsusdur/mənimdir; This belongs to a different historical period Bu başqa bir tarixi dövrə aiddir;* **2. (to)** üzv olmaq; *What party do you belong to? Sən/Siz hansı partiyanın üzvüsən/üzvüsünüz?*

**belongings** [bɪˈlɔŋɪŋz] *n pl* **1.** şəxsi əşyalar / şeylər; *I left my belongings in the hotel Mən şeylərimi mehmanxanada qoydum;* **2.** ləvazimat; hissə, detal *(maşına və s. aid)*; **3.** qohumlar, yaxın adamlar, ailə; **to be trouble enough to *one's* ~** ailəyə / qohumlarına başağrısı olmaq / vermək

**beloved¹** [bɪˈlʌvd] *n* **1.** istəkli, sevimli; sevgili; canan *(qadın, qız)*; **2.** *(dini dildə)* əzizlər, əziz dostlar; *Dearly beloved, we have met here today to witness the marriage of these 2 young people Əziz dostlar, biz bu gün bura bu 2 gəncin evlənməsinə şahidlik etmək üçün toplaşmışıq*

**beloved²** [bɪˈlʌvd] *adj* sevimli, istəkli; **his ~ wife** onun sevimli/istəkli arvadı; *His beloved wife had died Onun sevimli arvadı ölüb; She was beloved by / of his husband Onun əri onu (çox) sevirdi*

**below¹** [bɪˈlou] *adj* aşağıda, aşağıda verilmiş/göstərilmiş; **the information ~** aşağıda verilmiş / göstərilmiş məlumat

**below²** [bɪˈlou] *adv* aşağıda, aşağıdan; aşağı; **to be ~** aşağıda olmaq; *We could hear the noise below Biz aşağıdan səs eşidirdik; His apartment is just below Onun otağı düz bizdən aşağıdadır; He looked down from the mountain to the valley below O, dağdan aşağı dərəyə baxdı; See below Aşağı bax (səhifədə və s.)*; **to go ~** aşağı düşmək

**below³** [bɪˈlou] *prep* **1.** aşağı; **~ sea level** dəniz səviyyəsindən aşağı; **~ the third floor** dördüncü *(amer. üçüncü)* mərtəbədən aşağı; **2.** altında; aşağı; **~ the bridge** körpünün altında; **~ zero** sıfırdan aşağı; **~ the average** orta səviyyədən aşağı; **temperature ~ normal** normal temperaturdan aşağı; *A captain is below a general in rank Kapitan rütbəcə generaldan aşağıdır;* **~ ground** qəbirdə, torpağın altında; *It is below you Bu sənə/sizə yaraşmır; It would be below me to answer him Ona cavab verməyi mən öz ləyaqətimə sığışdıra bilmərəm; It is below his dignity O bunu ləyaqətinə sığışdırmır*



**belt¹** [belt] *n* **1.** toqqa, qayış, kəmər; **a nice new leather ~** qəşəng təzə dəri toqqa / qayış; **2.** korset *(bədəni düz saxlamaq üçün enli kəmər)*, bandaj *(sarğı, kəmər)*; **3.** qurşaq, zona, rayon, zolaq; **corn ~** *amer.* qarğıdalı zolağı; **shelter ~** tarlaqoruyucu meşə zolağı; **a green ~ around the city** şəhərətrafı yaşıl qurşaq / zolaq; **a ~ of ice** buz qurşağı; **4.** şpaler *(yolun hər iki tərəfində əkilmiş ağac və ya kol sırası)*; **5.** *hərb.* pulemyot lenti; **6.** *coğ.* nazik boğaz; **7.** *astr.* halqa; **the ~s of Jupiter** Yupiter halqaları;

◊ **to hit / to strike below the ~ 1)** qurşaqdan aşağı zərbə endirmək *(güləşdə, boksda)*; **2)** yasaq / qadağan edilmiş priyomdan istifadə etmək; **to tighten *one's* ~ 1)** toqqanı bərkitmək *(çox yemək)*; **2)** yoxsulluğa / ehtiyaca dözmək; *In a period of mass employment a lot of people must learn to tighten their belts Kütləvi işsizlik vaxtı çox adam toqqasını bərkitməyi öyrənməlidir;* **to have the champion's ~** çempion olmaq *(boks üzrə)*

**belt²** [belt] *v* **1.** qurşaqlamaq, toqqalamaq, kəmərləmək, qurşaq/toqqa/kəmər bağlamaq; *She belted (up) her coat O, paltosunun toqqasını bağladı;* **2.** qurşamaq; *He belted in his sword O, qılıncını qurşadı (belinə bağladı);* **3.** toqqa ilə/qayışla döymək; *He belted his son O, oğlunu toqqa ilə / qayışla döydü;* **4.** zərbə endirmək; bərk/var gücü ilə vurmaq *(xüsusən əllə)*; *I belted him in the eye Mən onun gözünə zərbə endirdim; The tennis player was so annoyed that he belted the ball right out of the court Tennisçi elə acıqlanmışdı ki, topu vurub kortdan çıxartdı*

**belt-conveyor** [ˈbeltkənˈveɪəʳ] *n* lentli transportyor / konveyer

**belted** [ˈbeltɪd] *adj* **1.** toqqalı, kəmərli; **a ~ coat** kəmərli/toqqalı palto; *I don't like to wear a belted coat Mən toqqalı/kəmərli palto geyməyi xoşlamıram;* **2.** zolaq-zolaq, zolaqlı; **~ cattle** hollandiya cinsli mal-qara *(zolaqlı heyvan)*

**belting** [ˈbeltɪŋ] *n* **1.** kəmərlər, toqqalar; *This shop carries quite a wide variety of belting Bu mağazada müxtəlif toqqalar / kəmərlər olur;* **2.** toqqa / kəmər üçün material

**beltline** [ˈbeltlaɪn] *n amer.* konveyer

**belt-line** [ˈbeltlaɪn] *n amer.* dairəvi tramvay / trolleybus xətti; dairəvi metro xətti

**belt-saw** [ˈbeltsɔ:] *n* lentvarı mişar

**belt-way** [ˈbeltweɪ] *n* dairəvi avtomobil yolu

**beluga** [bɪˈlu:gə] *n zool.* **1.** ağbalıq; **2.** ağ delfin *(qütb delfini)*

**bemad** [bɪˈmæd] *v şair.* dəli etmək

**bemire** [bɪˈmaɪəʳ] *v* çirkaba batırmaq/batmaq; *I was filthily bemired Mən tamam / başdan-başa çirkaba batmışdım*

**bemist** [bɪˈmɪst] *v* dumanlandırmaq, tutqunlaşdırmaq, pərdələmək; bürümək, çulğamaq, çulğalamaq

**bemoan** [bɪˈmoun] *v* ağlamaq; acımaq; sızlamaq; məyus olmaq; *She bemoaned her bitter fate O, uğursuz taleyinə acıyırdı*

**bemock** [bɪˈmɔk] *v* ələ salmaq, istehza etmək, masqaraya qoymaq; ələ salınmaq

**bemuse** [bɪˈmju:z] *v* **1.** son dərəcə heyrətləndirmək, heyrətə salmaq; mat qoymaq; **2.** məst/bihuş etmək, kefləndirmək

**bemused** [bɪˈmju:zd] *adj* **1.** heyrətə salınmış, karıxdırılmış, çaşdırılmış, çıxılmaz vəziyyətə salınmış; çətinə düşmüş; **2.** məst/ bihuş edilmiş, məst/bihuş olmuş

**bench¹** [bentʃ] *n* **1.** skamya; **a park ~** park skamyası; **2.** zalda məhkəmənin oturduğu yer; **3.** hakim, hakim vəzifəsi; *The bench declared... Məhkəmə ...elan etdi;* **4.** *top. i.* məhkəmə kollegiyası, məhkəmələr; **back ~es** parlamentin adi üzvləri; **5.** uzun/ağır iş stolu; **a carpenter's ~** xarrat stolu;

◊ **the ~ and the bar** hakimlər və vəkillər; **to sit on the ~ 1)** məhkəmə etmək, işə baxmaq; **2)** iclas etmək/keçirmək *(məhkəmə haq.)*; **to be raised to the ~** hakim vəzifəsinə təyin olunmaq; *He was raised to the bench Onu hakim / məhkəmə təyin etdilər*

**bench²** [bentʃ] *v* **1.** skamya qoymaq; **2.** skamyada oturtmaq; skamyada oturmaq; **3.** *id.* oyunçunu meydandan çıxartmaq / uzaqlaşdırmaq / kənar etmək; **4.** nümayiş etdirmək *(itləri)*

**bench-show** [ˈbentʃʃou] *n* heyvan nümayişi

**bend¹** [bend] *n* **1.** bükük, büküş; dirsək; qövs; **~ of the arm** dirsək büküyü; **2.** döngə; **a sharp ~ in a road** yolda sərt döngə; **a ~ of a river** çayın dirsəyi; *A road makes many bends Yolda çoxlu döngə var;* **3.** əymə, əyilmə; eniş, maillik; **a ~ of the head** başın əyilməsi; **back /front/side ~** dala / qabağa / yana əyilmə; **4.** cəhd, can atma, meyl, təşəbbüs;

◊ **above *one's* ~** *amer.* gücü xaricində, bacarığı xaricində; *Get a bend on you! Tərpən! Tərpəş! Tərpənin! Tərpəşin!*

**bend²** [bend] *v (pt, pp* **bent***)* **1.** əymək, bükmək, qatlamaq; **to ~ the iron rod / the wire** dəmir çubuğu / məftili əymək; **to ~ a pipe at the right angle** borunu düz bucaq altında əymək; **to ~ a bow** yayı əymək; **to ~ *one's* head in worship** hörmət əlaməti olaraq baş əymək; **to ~ down with age** qocalıqdan beli əyilmək / bükülmək; **to ~ over** üstünə əyilmək; **to ~ back /forward** geri/irəli (qabağa) əyilmək; **2.** əyilmək, bükülmək, qatlanmaq; *Lead bends easily Qurğuşun asan əyilir; The stick bends but*

*doesn't break Çubuq əyilir, lakin qırılmır; The reeds bend in the wind Qarğı / Qamış küləkdən əyilir;* **to ~ under a strain** təzyiq altında əyilmək; **to ~ beneath a burden** ağırlıq / yük altında əyilmək; 3. əymək; **to ~ *one's* body** bədənini əymək; **to ~ *one's* head over a book** başını kitab üzərinə əymək; 4. dönmək; döndərmək; *The road / The river bends to the right Yol / Çay sağa dönür;* **to ~ *one's* steps towards a place** bir tərəfə/istiqamətə getmək; **to ~ *one's* steps homewards** evə tərəf getmək; 5. özünə tabe etmək, öz təsirinə salmaq; əhliləşdirmək; **to ~ *smb.* to *one's* will** bir kəsi öz istəyinə tabe etmək; **to ~ *smb.* to a strict discipline** bir kəsi ciddi nizam-intizama tabe etmək; 6. tabe olmaq, boyun əymək; **to ~ to *smb.'s* will** bir kəsin arzusuna tabe olmaq; *I bent to her wishes Mən onun arzusuna tabe oldum;* 7. çevirmək, yetirmək, yönəltmək *(diqqəti, nəzəri və s.)*; **to ~ *one's* gaze on *smth.*** baxışını bir şeyə yönəltmək/çevirmək; *All eyes were bent on her Bütün gözlər ona tərəf zilləndi;* **with her eyes bent on the ground** gözlərini yerə zilləyərək; 8. istiqamətləndirmək; sərf / həsr etmək *(güc, cəhd və s.)*; **to ~ all *one's* energies to *smth.*** bütün qüvvəsini bir şeyə sərf/həsr etmək; **to ~ every effort towards *smth.*/towards doing *smth.*** bir şeyi etmək üçün hər cür səy göstərmək / əlindən gələni etmək; **to ~ *one's* mind to study** özünü oxumağa həsr etmək; *He couldn't bend his mind to his studies O özünü oxumağa məcbur edə bilmədi;* **to ~ *one's* rage against *smb.*** acığını bir kəsin üstünə tökmək;
◊ **to ~ the knee** 1) diz çökmək; 2) dua etmək; **to ~ the neck** boyun əymək, təslim olmaq; alçalmaq, özünü alçaltmaq; **to ~ to the oars** avarın üstünə əyilmək; **to ~ the brow** 1) qaşlarını endirmək; 2) qaş-qabağını tökmək, sımsırığını sallamaq, üz-gözünü turşutmaq

**beneath[1]** [bɪˈni:θ] *adv* aşağıda; *The sky above, the earth beneath Yuxarıda göy, aşağıda yer; The valley lay beneath Dərə / Vadi aşağıda idi*

**beneath[2]** [bɪˈni:θ] *prep* 1. aşağı, **~ *smb.'s* dignity** bir kəsin ləyaqətindən aşağı; *Such behaviour is beneath you Belə hərəkət sənə/sizə yaraşmır;* 2. altında; **~ the yoke of the conqueror** istilaçının boyunduruğu / zülmü altında; **to live ~ tyranny** müstəbidin zülmü altında yaşamaq; **to bend ~ a burden** yük altında əyilmək; *He sat beneath a shady tree O, kölgəli bir ağacın altında oturdu;* **to live ~ the same roof** bir dam altında yaşamaq; *There was no pillow beneath his head Onun başının altında balış yox idi;* 3. aşağıda; *The village was beneath the hill Kənd təpədən aşağıda idi*

**benedictine** [ˌbenɪˈdɪkti:n] *n* 1. benediktin *(likör növü)*; 2. rahib, rahib qız / qadın

**benediction** [ˌbenɪˈdɪkʃn] *n* 1. xeyir-dua vermə, xoşbəxtlik arzulama; *The priest pronounced a benediction over the happy pair Keşiş xoşbəxt evlənənlərə xeyir-dua verdi;* 2. razılıq, təşəkkür, minnətdarlıq; 3. dua etmə *(yeməkdən əvvəl və sonra)*

**benefaction** [ˌbenɪˈfækʃn] *n* 1. yaxşılıq, kömək, iltifat, əltutma, mərhəmət, şəfqət, rəhm; xeyriyyəçilik; 2. ianə, ianə vermə

**benefactor** [ˌbenɪˌfæktəʳ] *n* hami, hamilik edən adam; xeyirxah adam

**benefactress** [ˈbenɪfæktrɪs] *n* hami qadın / qız; xeyirxah qadın / qız

**benefice** [ˈbenɪfɪs] *n tar.* 1. benefisiya *(feodalizm dövründə qulluq əvəzində kral tərəfindən bağışlanan torpaq)*; 2. benefisiya *(katolik ruhanilərin hər cür əmlakı və gəliri)*

**beneficence** [bɪˈnefɪsəns] *n* 1. yaxşılıq, kömək, əltutma; 2. mərhəmət, şəfqət; mehribanlıq, rəhmdillik

**beneficent** [bɪˈnefɪsənt] *adj* 1. mərhəmətli, şəfqətli; rəhmli, rəhmdil; xoşxasiyyət, mehriban; 2. xeyirli, faydalı, səmərəli; **~ bacteria** faydalı bakteriyalar

**beneficial** [ˌbenɪˈfɪʃl] *adj* 1. xeyirli; faydalı, səmərəli, yaxşı nəticə verə bilən; 2. şəfaverici, şəfaverən, şəfalı, sağaldıcı, canaxeyir; **~ effect** müsbət təsir; *I hope your holiday will be beneficial Ümid edirəm ki, məzuniyyətin / məzuniyyətiniz sənin / sizin üçün faydalı olacaq*

**beneficially** [ˌbenɪˈfɪʃlɪ] *adv* faydalı, xeyirli; səmərəli; şəfqətli

**beneficiary** [ˌbenɪˈfɪʃərɪ] *n tar.* benefisiya sahibi; feodal vassalı

**benefit[1]** [ˈbenɪfɪt] *n* 1. üstünlük, imtiyaz; 2. fayda, xeyir, mənfəət; **for the ~ of *smb.*** bir kəsin xeyrinə; **for your special ~** ancaq sənin/sizin xatirinə / xatirinizə; **to be for the ~ of *one's* health** sağlamlığına faydalı olmaq; **to give *smb.* the ~ of *one's* experience** bir kəslə təcrübəsini bölüşdürmək; *He gave us the benefit of his advice O, məsləhəti ilə bizə kömək etdi; The book wasn't of much benefit to me Bu kitab mənə elə bir fayda vermədi;* **to get/to derive ~ from *smth.*** bir şeydən fayda götürmək; 3. yaxşılıq, kömək, əltutma; mərhəmət, şəfqət, rəhm; **to confer ~s on/upon *smb.*** bir kəsə çox kömək etmək; 4. təqaüd, müavinət *(işsizlik və s. üçün)*; **maternity / sickness / unemployment ~** analığa / xəstəliyə / işsizliyə görə verilən müavinət

**benefit[2]** [ˈbenɪfɪt] *adj* xeyriyyə; **~ concert / performance** xeyriyyə konserti/tamaşası

**benefit[3]** [ˈbenɪfɪt] *v* 1. xeyir / fayda vermək; xeyir gətirmək; kömək etmək; xeyriyyə köməkliyi göstərmək; *The sea air will benefit you Dəniz havası sənə/sizə kömək edəcək;* 2. kömək almaq, fayda əldə etmək; *He benefited by the medicine Dərman ona kömək etdi*



**benefit-society** [ˈbenɪfɪtsəˈsaɪətɪ] *n* qarşılıqlı yardım cəmiyyəti

**benevolence** [bɪˈnevələns] *n* 1. xeyirxahlıq; iltifat; 2. mehribanlıq, xoşxasiyyət, mərhəmət; **a man of great ~ character** çox mərhəmətli adam, böyük mərhəmət sahibi; 3. xeyriyyəçilik; səxavətlilik, əliaçıqlıq, comərdlik; 4. yaxşılıq, kömək, əltutma; ianə, ianə vermə; **to give ~** ianə vermək, kömək etmək

**benevolent** [bɪˈnevələnt] *adj* 1. xeyirxah, dost, iltifatlı, meyl/təvəccöh göstərən; 2. səxavətli, əliaçıq; mərd, comərd, alicənab

**benevolently** [bɪˈnevələntlɪ] *adv* 1. xeyirxahcasına, iltifatla; 2. səxavətlə, mərdcəsinə, comərdcəsinə, alicənablıqla

**benight** [bɪˈnaɪt] *v şair* gecəni qaranlığa bürümək /qərq etmək

**benightedly** [bɪˈnaɪtɪdlɪ] *adv* nadancasına, avamcasına, cahilcəsinə, nadan/avam bir tərzdə

**benign** [bɪˈnaɪn] *adj* 1. mərhəmətli, lütfkar, rəhmli, rəhmdil, ürəyinazik; 2. həlim, mülayim, yumşaq, sakit, quzu kimi; mehriban, nəvazişli; şəfqətli; 3. yumşaq; mülayim *(iqlim haq.)*; 4. münbit, məhsulverən *(torpaq haq.)*; 5. *tib.* yüngül, xətərsiz, qorxusuz, zərərsiz, təhlükəsiz; 6. xoşxassəli *(şiş haq.)*; **a ~ tumour** xoşxassəli şiş

**benignant** [bɪˈnɪgnənt] *adj* xeyirxah, dost, iltifatlı, təvəccöh göstərən; xoşxasiyyət, rəhmli, mərhəmətli

**benignity** [bɪˈnɪgnɪtɪ] *n* mehribanlıq, xoşxasiyyətlilik, rəhmdillik, mərhəmət, insaf, şəfqət, yumşaqürəklilik

**benignly** [bɪˈnaɪnlɪ] *adv* 1. mərhəmətlə, lütfkarlıqla, rəhmdilliklə; 2. mülayimcəsinə, mülayim bir tərzdə; 3. sakitcə, xəfif; **to smile ~** xəfifcə gülümsəmək

**bent[1]** [bent] *n* 1. meyl, həvəs, təmayül, arzu, qabiliyyət; cəhd, canatma; **to have a ~ for study/music/poetry** təhsilə/musiqiyə/poeziyaya meyli olmaq; **to follow *one's* ~** öz arzusuna / zövqünə uyğun hərəkət etmək; *She has a natural bent for sewing Onun təbiətən tikişə meyli var;* 2. dartılma, gərilmə, tarımlaşma; gərilmə qabiliyyəti *(yay və s. haq.)*; 3. əyri, bükük; döngə

**bent[2]** [bent] *adj* 1. əyilmiş, bükülmüş, qatlanmış, əyri, bükük; *He was bent with age Yaş onun qəddini / belini bükmüşdü;* 2. namussuz, şərəfsiz; 3. homoseksual

**bent[3]** [bent] **to bend** *felinin pt, pp formaları*

**benumb** [bɪˈnʌm] *v* 1. keyləşdirmək; *Her hands were benumbed by/with cold Onun əlləri soyuqdan keyləşmişdi;* 2. iflic / key etmək

**benumbed** [bɪˈnʌmd] *adj* 1. keyimiş, keyləşmiş, donmuş; 2. kütləşmiş, kütləşdirilmiş

**benzene** [ˈbenzɪ:n] *n kim.* benzol *(anilin və partlayıcı maddələr istehsal etmək üçün rəngsiz yanan maye)*

**benzin** [ˈbenzɪ:n] *n* = **benzine**

**benzine** [ˈbenzi:n, benˈzi:n] *n* benzin

**benzol** [ˈbenzɔl] *n* benzol, xam benzol

**bequeath** [bɪˈkwi:ð] *v* 1. vəsiyyət etmək; *He has bequeathed me his gold watch O, qızıl saatını mənə vəsiyyət edib;* 2. *məc.* qoymaq, qoyub getmək; **discoveries ~ed to us by the scientists of the last century** keçən əsrin alimlərinin bizə qoyub getdikləri kəşflər

**bequeather** [bɪˈkwi:ðəʳ] *n* vəsiyyət edən

**bequest** [bɪˈkwest] *n* 1. varis üçün qalan əmlak / var-dövlət/pul; ölərkən verilən bəxşiş/hədiyyə; 2. *hüq.* əmlakdan/mülkdən vəsiyyətlə əl çəkmə; **to make a ~ of** vəsiyyət etmək

**berate** [bɪˈreɪt] *v* məzəmmət etmək, danlamaq

**bereave** [bɪˈri:v] *v (pt, pp* **bereaved** [-d], *və ya* **bereft** [bɪˈreft] 1. itirmək; əlindən almaq, yaxın qohumlarını itirmək; **to be ~d of *one's* parents /wife /friend** valideynlərini/arvadını/dostunu itirmək; *He was bereaved of his wife O, arvadını itirdi (yəni onun arvadı öldü);* **to be ~d of all hope** bütün ümidlərini itirmək; *An accident bereft him of his children Bədbəxt hadisə onun uşaqlarını əlindən aldı;* **to be bereft of *one's* joy / life / last hope** sevincini / həyatını / son ümidini itirmək; 2. *hüq.* soymaq, qarət etmək, talamaq, talan etmək

**bereaved** [bɪˈri:vd] *adj* qohumunu/yaxın dostunun itirmiş *(ölüm nəticəsində)*; ağır itki vermiş ana; **the ~ husband** arvadını itirmiş ər; **a ~ mother** uşağını itirmiş ana, uşağı ölmüş ana

**bereavement** [bɪˈri:vmənt] *n* 1. ağır itki *(xüs. yaxın qohumun ölümü)*; *We send our condolences to you on your recent bereavement Sənə/Sizə baş vermiş ağır itki ilə əlaqədar başsağlığımızı qəbul et/ edin;* 2. məhrumiyyət; məhrum etmə/ olma, ehtiyac

**bereft** [bɪˈreft] **to bereave** *felinin pt, pp formaları*

**beret** [ˈbereɪ, bəˈreɪ] *n* beret *(baş geyimi)*

**berg** [bə:g] *n* aysberq, üzən buz dağı

**bergamot** [ˈbə:gəmɔt] *n bot.* berqamot *(ağac növü)*

**bergamot pear** [ˈbə:gəmɔtpeəʳ] *n bot.* berqamot armudu

**beriberi** [ˈberɪˈberɪ] *n tib.* beri-beri *(vitaminsizlik nəticəsində əmələ gələn xəstəlik)*

**berry[1]** [ˈberɪ] *n* 1. giləmeyvə; 2. kürü dənəsi; 3. dən *(kofe və s.)*

**berry[2]** [ˈberɪ] *v* 1. giləmeyvə yığmaq; **to go ~ing** giləmeyvə yığmağa getmək; *They have gone berrying Onlar giləmeyvə yığmağa gediblər;* 2. giləmeyvə gətirmək *(ağac haq.)*

**berserk** [ˈbə:sə:k] *n tar.* 1. qeyzli / cəsur / qorxmaz/hiddətli skandinav döyüşçüsü; 2. azğın/qudurğan adam; **to go ~** azğınlaşmaq; dəli olmaq, ağlını itirmək; *On hearing the terrible news he went berserk Dəhşətli xəbəri eşidərkən o, dəli oldu*

**berth**[1] [bə:θ] *n* 1. gəminin limanda bağlandığı yer; 2. gəmidə / qatarda yatmaq üçün yer; 3. kayut *(gəmidə ayrıca otaq)*; 4. iş, vəzifə; **good** ~ sərfəli/xeyirli vəzifə

**berth**[2] [bə:θ] *v* 1. yanaşdırıb bağlamaq *(gəmini və s.)*; *The captain berthed his ship at midday Kapitan günorta sahilə yan alıb gəmisini körpüyə bağladı;* 2. yataq yeri vermək; yataq yeri tutmaq; 3. yan almaq, yanaşmaq *(gəmi və s.)*; 4. iş / vəzifə vermək

**beryl** ['berıl] *n miner.* beril *(sarıya çalan və ya yaşıl rəngli şəffaf, qiymətli daş)*

**beseech** [bı'sı:tʃ] *v (pp, pt.* **besought** [bı'sɔ:t]*; və ya* **beseeched***)* yalvarmaq, yaxarmaq, yalvarıb yaxarmaq, xahiş etmək, rica etmək; **to ~ *smb.* for *smth.*** bir kəsdən bir şey üçün xahiş / rica etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsdən bir şeyi etməyi xahiş / rica etmək; *I beseech you to listen Yalvarıram/Xahiş edirəm, qulaq as / asın; I beseech you never pronounce this word again Səndən/Sizdən xahiş edirəm, bu sözü bir də demə / deməyin*

**beseecher** [bı'si:tʃəʳ] *n* xahiş edən, yalvaran *(adam)*, iltimasçı

**beseeching** [bı'si:tʃıŋ] *adj* yalvarışçı, yalvaran; yalvarış ifadə edən/bildirən, ricaedici

**beseem** [bı'si:m] *v* yaraşmaq, layiq olmaq, münasib olmaq; *It ill beseems you to refuse İmtina etmək sizə yaraşmır; His modesty beseemed him well Təvazökarlığı ona yaxşı yaraşırdı*

**beset** [bı'set] *v (* **-tt-***; pt, pp* **beset***; pr. p* **besetting***)* 1. dövrələmək, mühasirəyə almaq, əhatə etmək, araya almaq; *The enemy beset the city with a strong army Düşmən şəhəri güclü ordu ilə mühasirəyə aldı;* 2. tutmaq, kəsmək *(yolu və s.)*; 3. bürümək, əhatə etmək, çulğalamaq; *He was beset by doubts Şübhələr onu çulğamışdı; Şübhələr onu bürümüşdü; The plan was beset with difficulties from the beginning Plan ilk əvvəldən bir çox çətinliklərlə qarşılaşdı*

**besetting** [bı'setıŋ] *adj* təqib edən, izləyən; narahat edən; **a ~ difficulty** narahat edən çətinlik; **~ temptation** təqib edən nəfs / tamah

**beside** [bı'saıd] *prep* 1. yanında, yan-yana, yanaşı, yaxınlığında, böyründə; **to sit ~ *smb.*** bir kəsin yanında/böyründə oturmaq; bir kəslə yan-yana oturmaq; **to stand ~ *smb.*** bir kəsin yanında/yaxınlığında/böyründə durmaq, bir kəslə yan-yana durmaq / dayanmaq; *He sat beside his friend O, dostunun yanında oturdu; The child was walking beside his mother Uşaq anası ilə yan-yana/yanaşı gedirdi;* **a town ~ the sea** dənizin yaxınlığındakı şəhər; 2. müqayisədə, yanında; *Beside him all poets are insignificant Onunla müqayisədə qalan şairlər bir şeyə dəyməz;* 3. boyunca; *There is a path beside the river Çay boyunca cığır var;* 4. xaric, kənar; xaricində; **~ the mark 1)** hədəfdən kənar; **2)** yersiz; **~ the point/the question** məsələyə dəxli olmayan, məsələdən kənar; *It is beside our purpose Bunun bizim məqsədimizə dəxli yoxdur; It goes beside my subject to discuss this problem Bu məsələnin müzakirəsi mənim mövzumdan kənara çıxır; This is beside the matter in hand Bunun müzakirə edilən məsələyə dəxli yoxdur;* 5. başqa; *He has nothing beside this Onun bundan başqa heç nəyi / şeyi yoxdur*

**besides**[1] [bı'saıdz] *adv* bundan əlavə / başqa, bununla yanaşı, həm də, buna əlavə olaraq; **nothing ~** ancaq bu, başqa heç nə; *I have, besides, two sisters Bundan əlavə / başqa mənim iki bacım var; It is too late. Besides, I am tired Çox gecdir. Bundan əlavə, mən yorulmuşam*

**besides**[2] [bı'saıdz] *prep* əlavə, başqa; *I want nothing besides this Bundan əlavə / başqa mən heç nə/şey istəmirəm; They were five besides Tom Tomdan əlavə, onlar beş nəfər idilər*

**besiege** [bı'si:dʒ] *v* 1. *hərb.* mühasirəyə almaq, mühasirə etmək; *(şəhəri, qalanı və s.)*; **to ~ a town** şəhəri mühasirəyə almaq; *Troy was besieged by the Greeks for ten years Troya yunanlar tərəfindən on il mühasirəyə alınmışdı;* 2. əhatə etmək, əhatəyə almaq; *He was besieged by his fans Tərəfdaşları onu əhatəyə almışdılar;* 3. **(with)** yağdırmaq, basmaq *(suala və s.)*; *The teacher was besieged with questions Müəllimi suala tutmuşdular/ basmışdılar*

**besiegement** [bı'sıdʒmənt] *n* mühasirə, mühasirəyə alma / alınma

**besieger** [bı'si:dʒəʳ] *n* mühasirəyə alan tərəf / adam

**beslave** [bı'sleıv] *v* qul etmək, əsarət altına almaq; kölə halına salmaq

**besmear** [bı'smıəʳ] *v* yağa batırmaq; çirkləndirmək, kirləndirmək; *After his work on the car his hands were besmeared with dirt Maşını üzərində işdən sonra onun əlləri yağla çirklənmişdi / yağa batmışdı*

**besmirch** [bı'smə:tʃ] *v* 1. çirkləndirmək, çirk etmək; 2. ləkələmək, çirk etmək; 3. *məc.* ləkələmək; **to ~ *one's* reputation** öz adını ləkələmək; *His reputation was besmirched Onun adı ləkələndi/ləkələnmişdi*

**besmoke** [bı'smouk] *v* tüstü vermək, tüstülətmək

**besom**[1] ['bı:zəm] *n* süpürgə; çalğı

**besom**[2] ['bı:zəm] *v* süpürmək, süpürüb təmizləmək, çalğılamaq

**besot** [bı'sɔt] *v* (**-tt-**)1. keflәndirmək, sərxoş/ məst etmək; başını gicəltmək *(şərab haq.)*; bihuş etmək; 2. ələ salmaq, axmaq yerinə qoymaq, aldatmaq

**besotted** [bı'sɔtıd] *adj* keflәndirilmiş, bihuş / sərxoş edilmiş, bihuş / sərxoş olmuş; **~ with love** məhəbbətdən bihuş olmuş; **~ with drink** içməkdən sərxoş olmuş / keflənmiş

**besought** [bı'sɔ:t] **to beseech** *felinin pt, pp formaları*



**bespatter** [bı'spætəʳ] *v* çirkləndirmək; batırmaq *(çirkə)*, sıçratmaq *(çirki)*; ləkələmək, ləkə yaxmaq, biabır etmək; üstünə böhtan atmaq

**bespeak** [bı'spı:k] *v (pt* **bespoke** [bı'spouk], *pp* **bespoken** [bı'spoukən] 1. əvvəlcədən sifariş etmək; **to ~ a box at the theatre** teatrda loja sifariş etmək; *Every room in this hotel is already bespoken Bu mehmanxanada bütün otaqlar əvvəlcədən tutulub;* 2. arxayın olmaq; *May I bespeak your help? Mən sənin / sizin köməyinə / köməyinizə arxayın ola bilərəmmi?;* 3. sifarişlə tikdirmək *(ayaqqabı, paltar və s.)*; 4. göstərmək, sübut etmək; *His manners bespoke him to be a gentleman Onun hərəkətləri / davranışları göstərdi ki, o tərbiyəli adamdır;* 5. qabaqcadan xəbər vermək/göstərmək; qabaqcadan bildirmək; *Today's events bespeak future tragedy Bugünkü hadisələr gələcək faciəni (əvvəlcədən) xəbər verir;* 6. *şair.* müraciət /xitab etmək

**bespeckle** [bı'spekl] *v* al-əlvan bəzəmək, müxtəlif boya ilə rəngləmək

**bespectacled** [bı'spektəkld] *adj* eynəkli, eynək geymiş / geyən

**bespoke** [bı'spouk] **to bespeak** *felinin pt forması*

**bespoken** [bı'spoukn] **to bespeak** *felinin pp forması*

**best**[1] [best] *n* ən yaxşı hissə / vəziyyət; *The best part of life is past Ömrün ən yaxşı hissəsi keçdi; I am never at my best in the morning Mən səhərlər heç vaxt özümü yaxşı hiss etmirəm*

**best**[2] [best] *adj* **good** *sifətinin üst. dərəcə forması;* ən yaxşı; **the ~ thing** ən yaxşı şey; **the ~ driver** ən yaxşı sürücü; *He is the best driver in our village O bizim kənddə ən yaxşı sürücüdür;*

◊ **at ~** ən yaxşı halda; **to do/to try *one's* ~** əlindən gələni etmək; **to make the ~ of *one's* way** mümkün qədər tez / cəld getmək, tələsmək

**best**[3] [best] *v* qalib gəlmək, məğlub etmək; *After a long struggle we bested them Uzun mübarizədən sonra biz onları məğlub etdik*

**best**[4] [best] *adv* 1. **well** *zərfinin üst. dərəcə forması;* ən yaxşı tərzdə, ən yaxşı; **to work ~** hamıdan yaxşı işləmək; *Saturday would suit me best Mənim üçün ən əlverişli şənbə günüdür;* 2. ən yaxşı, hər şeydən çox; *Which do you like best? Sənin/Sizin ən çox nədən xoşun/xoşunuz gəlir?*

◊ **at ~** ən yaxşı halda; *At best we can do only half as much as last year Ən yaxşı halda biz keçən il gördüyümüz işin yarısını görə bilərik;* **had ~** ən yaxşısı; *You had best stay at home Ən yaxşısı budur ki, sən /siz evdə qalasan /qalasınız*

**bestial**[1] ['bestjəl] *n* mal-qara, iribuynuzlu heyvan

**bestial**[2] ['bestıəl,'bestjəl] *adj* 1. qaba, kobud, alçaq, heyvan; yırtıcı, vəhşi; 2. utanmaz, həyasız; 3. iyrənc, çirkin, mənfur; natəmiz

**bestiality** [ˌbestı'ælıtı] *n* 1. qabalıq, heyvanlıq, alçaqlıq, əclaflıq; kobudluq; 2. utanmazlıq, həyasızlıq, ədəbsizlik; 3. sodomiya *(heyvanla cinsi əlaqə)*; pedarastiya, uşaqbazlıq

**bestially** ['bestıəlı] *adv* 1. heyvancasına, heyvan kimi, qaba, kobud, kobudcasına; vəhşicəsinə 2. utanmazcasına, həyasızcasına, utanmadan

**bestiary** ['bestıərı] *n heyvanlar haqqında təmsil, nağıl və alleqoriyalardan ibarət kitab / toplu*

**bestir** [bı'stə:] *v* oyatmaq, oyandırmaq, ayıltmaq; hərəkət etməyə həvəsləndirmək, təhrik etmək; **to ~ oneself** özünü fəallaşdırmaq hərəkət etmək; tərpətmək, fəallaşdırmaq; *We must bestir ourselves to take the necessary decision Lazımi qərar qəbul etmək üçün biz gərək ciddi hərəkət edək*

**best looker** ['best'lu:kəʳ] *amer. d.d.* gözəl adam

**bestman** ['best'mæn] *n* sağdış, soldış

**bestow** [bı'stou] *v* **(on, upon)** 1. vermək, bağışlamaq, hədiyyə etmək/vermək; mükafatlandırmaq; ənam vermək, təltif etmək; **to ~ an office** vəzifə vermək; *He bestowed a fortune upon his son O, oğluna var-dövlət qoydu; Several gifts were bestowed on the guests Qonaqlara bir neçə hədiyyə verildi;* 2. həsr etmək; sərf etmək *(vaxt, güc)*; *He bestowed much time on the project O bu layihəyə çox vaxt sərf etdi;* 3. *arx.* ərə vermək

**bestowal** [bı'stouəl] *n şair.* hədiyyə, bəxşiş, sovqat; ənam; mükafatlandırma, təltif etmə / edilmə

**bestrew** [bı'stru:] *v (pt* **bestrewed**, *pp* **bestrewn** *və ya* **bestrewed***)* 1. səpələmək, səpmək; tökmək; *They bestrewed flowers the grave of the dead child Onlar ölmüş uşağın qəbrinin üstünə gül səpdilər/tökdülər;* 2. qalın qatla örtmək; döşəmək; **to ~ the floor with papers** döşəməni qəzetlə döşəmək

**bestrewn** [bı'stru:n] **to bestrew** *felinin pp forması*

**bestridden** [bı'strıdn] **to bestride** *felinin pp forması*

**bestride** [bı'straıd] *v (pt* **bestrode**; *pp* **bestridden***)* 1. at belində oturmaq; **~ a chair** stulu at kimi / paçaayırma minmək; 2. qıçlarını aralı qoyaraq dayanmaq; 3. adlayıb keçmək, üstündən keçmək; addamaq, aşmaq *(bir şeyin üstündən)*

**bestrode** [bı'stroud] **to bestride** *felinin pt forması*

**bet**[1] [bet] *n* 1. mərc, bəhs; **even ~** eyni şanslı mərc; **to make/to lay a ~** mərc gəlmək/etmək; **to lose/ to win a ~** mərci uduzmaq/udmaq; *Let's make a bet Gəl/ Gəlin mərc gələk;* 2. ortaya qoyulan pul *(qumarda)*; şərt *(mərcdə)*; 3. haqqında mərc gəlinən komanda / adam və s.

**bet**[2] [bet] *v (* **-tt-**; *pt* **bet**, *pp* **betted** [-ıd]) mərc gəlmək; **to ~ on *smth.*** bir şeyə görə/bir şeydən mərc gəlmək; *I never bet Mən heç vaxt mərc gəlmirəm; He bet me a pound that he would win O mənimlə bir funtdan mərc gəldi ki, o qalib gələcək; He bet me five pounds on the horse O bu atın udacağına mənimlə beş funtdan mərc gəldi; I'll bet against your winning the game*

*Mən mərc gələrəm ki, sən / siz oyunu udmayacaqsan / udmayacaqsınız; I bet he doesn't turn up Mərc gəlirəm ki, o gəlməyəcək;*
◊ **to ~ one's bottom dollar on smth.** bir şeyə tam əmin olmaq, bir şeyə şübhəsi olmamaq
**beta** ['bi:tə] *n* 1. beta *(yunan əlifbasının ikinci hərfi)*; 2. *astr.* bürclərdən parlaqlığına görə ikinci ulduz
**betake** [bɪ'teɪk] *v* (*pt* **betook**, *pp* **betaken**): 1. **to ~ oneself (to)** müraciət etmək; həsr etmək; **to ~ oneself to one's studies** özünü təhsilinə həsr etmək; 2.: **to ~ oneself** getmək, yola düşmək, yollanmaq; *He betook himself to the palace to see the King O, kralı görmək üçün saraya getdi / yollandı;*
◊ **to ~ oneself to one's heels** əkilmək, götürülmək, daban almaq, *d.d.* dabanına tüpürmək, arxasına baxmadan getmək
**betaken** [bɪ'teɪkn] **to betake** *felinin pp forması*
**beta-particles** ['bi:tə'pa:tɪklz] *n fiz.* beta-hissəciklər
**beta rays** ['bi:tə'reɪz] *n fiz.* beta şüalar
**betel** ['bi:təl] *n bot.* betel *(qara istiot kolu)*
**bethel** ['beθəl] *n* 1. müqəddəs yer; 2. *amer.* dənizçilərin ibadət yeri; 3. təriqətçilərin kilsəsi *(İngiltərədə)*
**bethink** [bɪ'θɪŋk] *v* (*pt, pp* **bethought**) yadına salmaq, xatırlamaq; *I bethought me / myself that I ought to write some letters Mən xatırladım ki, mən gərək bir neçə məktub yazım*
**bethought** [bɪ'θɔ:t] **to bethink** *felinin pt, pp formaları*
**betid** [bɪ'tɪd] **to betide** *felinin pt, pp formaları*
**betide** [bɪ'taɪd] *v* (*pt, pp* **betid** [bə'tɪd]) baş/üz vermək; *Whatever betide Nə olur olsun; We shall remain friends whatever may betide Nə baş verir versin, biz dost kimi qalacağıq*
**betimes** [bɪ'taɪmz] *adv şair.* 1. vaxtında, məqamında, öz vaxtında; 2. tez, cəld, yeyin; 3. tezdən, erkən; **to rise ~** tezdən/erkən qalxmaq *(səhər); We must be up betimes tomorrow Biz sabah tezdən durmalıyıq*
**betoken** [bɪ'toukən] *v* xəbər vermək, göstərmək, bildirmək, ifadə etmək; *Those black clouds betoken a storm O qara buludlar tufan olacağını xəbər verir/göstərir*
**beton** [beɪ'tɔ:ŋ, 'betən] *n tik.* beton
**betook** [bɪ'tuk] **to betake** *felinin pt forması*
**betray** [bɪ'treɪ] *v* 1. xəyanət etmək, xain çıxmaq, satqınlıq etmək; *He betrayed his principles O öz principlərinə xəyanət etdi;* 2. ələ vermək, satmaq, açmaq, aşkar etmək; **to ~ oneself** 1) özünü ələ vermək; 2) bilmədən ağzından qaçırmaq; *His face betrays his fear Onun üzündən görünür ki, o qorxur, Onun qorxması üzündən məlum olur;* 3. doğrultmamaq *(etimadı, ümidi); He betrayed my trust in him O mənim ona olan etimadımı doğrultmadı;* 4. aldatmaq; tamahlandırmaq

**betrayal** [bɪ'treɪəl] *n* xəyanət, satqınlıq
**betrayer** [bɪ'treɪə^r] *n* satqın, xain, xəyanətkar, dönük; vəfasız, namərd
**betroth** [bɪ'trouð] *v* nişanlamaq, adaxlamaq, ad etmək / eləmək; **to ~ oneself to smb.** bir kəslə adaxlanmaq/nişanlanmaq; *The girl is betrothed to him Qız onunla nişanlanıb; His father betrothed him at an early age Atası onu kiçik yaşında nişanladı / adaxladı*
**betrothal** [bɪ'trouðəl] *n* nişanlama, nişanlanma, adaxlama, adaxlanma; ad etmə / eləmə, nişan
**betrothed** [bɪ'trouðd, bɪ'trouθt] *n* nişanlı *(oğlan)*; adaxlı *(oğlan); She was at the theatre with her betrothed O, adaxlısı ilə teatrda idi;* **the ~ pair** adaxlılar; *The betrothed stood before the priest Adaxlılar keşişin qarşısında dayanmışdılar/durdular*
**betrust**[1] [bɪ'trʌst] *n arx.* etibar, inam, etimad
**betrust**[2] [bɪ'trʌst] *v arx.* inanmaq, etibar etmək; vəkalətnamə vermək
**better**[1] ['betə^r] *n* mərc gələn adam
**better**[2] ['betə^r] *adj* 1. **good** *sifətinin müqayisə dərəcə forması:* daha / nisbətən yaxşı; daha münasib; *This is good but that is better Bu yaxşıdır, amma/ancaq o daha yaxşıdır; He is a better man than his brother O, qardaşından daha yaxşı adamdır; The old man has seen better days Qoca kişi daha yaxşı günlər görüb; I am feeling better to-day Mən özümü bu gün daha yaxşı hiss edirəm;* 2. daha böyük, daha çox; **the ~ part/half of smth.** bir şeyin daha böyük hissəsi;
◊ **~ sort** görkəmli / məşhur adamlar; **one's ~ half** arvadı; **to think (all) the ~ of smb.** bir kəs haqqında yüksək fikirdə olmaq; **to do / to be ~ than one's word** vəd verdiyindən çox iş görmək
**better**[3] ['betə^r] *v* 1. yaxşılaşdırmaq; təkmilləşdirmək; **to ~ one's living conditions** yaşayış şəraitini yaxşılaşdırmaq; *They bettered their living conditions Onlar həyat şəraitlərini yaxşılaşdırdılar;* **to ~ last year's results** keçən ilin nəticələrini yaxşılaşdırmaq; **to ~ a sport record** idman rekordunu təzələmək; 2.: **to ~ oneself** irəliləmək *(vəzifədə, təhsildə)*; çoxlu pul qazanmaq; *She hopes to better herself O ümid edir ki, vəziyyətini yaxşılaşdıracaq; In a few years he had bettered himself considerably by his talents and industry İstedadı və zəhmətsevərliyi nəticəsində o, bir neçə il ərzində irəlilədi (vəzifədə);* 3. ötüb keçmək, üstün gəlmək, geridə buraxmaq
**better**[4] ['betə^r] *adv* **well** *zərfinin müqayisə dərəcəsi:* daha/nisbətən yaxşı; *He swims better than I do O məndən daha yaxşı üzür; You would write better if you had a good pen Sənin / Sizin yaxşı qələmin / qələminiz olsa idi, sən / siz daha yaxşı yazardın / yazardınız;*
◊ **to think ~ of smth.** bir şey haqqında fikrini dəyişmək *(yaxşı mənada); I know better Məni*



*aldada / tovlaya bilməzsən; Better late than never at. söz. Heç vaxt olmamaqdansa, gec olmaq yaxşıdır; The sooner the better Nə qədər tez olsa, o qədər yaxşıdır*
**betterment** ['betəmənt] *n* 1. yaxşılaşma, yaxşılaşdırma; təkmilləşmə, təkmilləşdirmə; islah/təshih etmə, düzəltmə, təshih; 2. *k.t.* meliorasiya *(qurutma, suvarma və s. yolu ilə torpağın münbitliyini artırma)*; 3. *hüq.* varı/dövləti artırma; 4. *tex.* müasirləşdirmə, müasirləşdirilmə, yeniləşmə, yeniləşdirilmə, təkmilləşmə, təkmilləşdirilmə
**bettor** ['betə^r] *n* = **better**[1]
**betters** ['betəz] *n* yüksək rütbəli və hörmətli adamlar; böyüklər; *Don't speak that way to your betters, young man! Öz böyüklərinlə bu tərzdə danışma, cavan oğlan!*
**between**[1] [bɪ'twi:n] *adv* araya, arada, arasında; *I attended the two lectures and had lunch in between Mən hər iki mühazirədə iştirak etdim, arada günorta yeməyi yedim; There is only the tree and the rock, captain; I can see nothing between Kapitan, mən ağac və qayadan başqa arada heç nə görə bilmirəm*
**between**[2] [bɪ'twi:n] *prep* 1. arasında; **a railway ~ 2 cities** 2 şəhər arasında dəmiryolu; **to divide smth. ~ two persons** bir şeyi iki adam arasında bölmək; *Devide the apples between the two children Almanı iki uşaq arasında bölün; What is the difference between this and that Bununla onun arasında fərq nədir?* **a quarrel ~ two friends** iki dost arasında mübahisə; **a football match ~ Neftchi and Shamkir** Neftçi və Şəmkir komandaları arasında futbol yarışı; **war ~ 2 countries** 2 ölkə arasında dava / müharibə; **a marriage ~ Mr. A and Mrs. B** cənab A və xanım B arasında izdivac/evlənmə; 2. birlikdə, bir yerdə; *Let's do it between Gəl/Gəlin bunu birlikdə/bir yerdə edək; They dragged the boat between them Onlar qayığı birlikdə dartıb çıxartdılar;* 3. görə, üzündən, ucbatından; -dan, -dən; *Between her job and studies she has no time for fun İşi və oxumasına (təhsilinə) görə onun əyləncə üçün vaxtı yoxdur; Choose between them Onlardan birini seç/seçin;* **in ~** 1) orta vəziyyətdə; 2) arasında; **~ whiles** hərdənbir, arabir
**bevel**[1] ['bevəl] *n tex.* 1. çəplik, əyrilik; maillik, meyl; eniş; bucaq *(düz bucaqdan başqa)*; 2. *tex.* xarrat künyəsi
**bevel**[2] ['bevəl] *adj* əyri, qıyqac, çəp, çəpbucaqlı
**bevel**[3] ['bevəl] *v* çəpləşdirmək, əymək, çəp kəsmək
**beverage** ['bevərɪdʒ] *n* içki; **alcoholic ~s** spirtli içkilər; **hot ~s** isti içkilər *(çay, kofe və s.)*
**bevy** ['bevɪ] *n* 1. böyük dəstə, kampaniya; **a ~ of beauties** bir dəstə gözəl; 2. komplekt, dəst; 3. sürü, qatar, dəstə*(xüs. quş)*
**bewail** [bɪ'weɪl] *v* kədərlənmək, qəmlənmək, qüssələnmək; xiffət çəkmək; ağlamaq, göz yaşı axıtmaq/tökmək; təəssüf etmək; acımaq; **to ~ the death of a friend** dostun ölümünə kədərlənmək / qəmlənmək/göz yaşı axıtmaq/təəssüf etmək; *He was bewailing his failure in the examination O, imtahanda kəsildiyi/imtahan verə bilmədiyi üçün xiffət çəkirdi*
**beware** [bɪ'weə^r] *v* 1. qorunmaq, özünü gözləmək, ehtiyatlı olmaq; *Beware of the dog! İtdən özünü/özünüzü gözlə/ gözləyin! Beware of the pickpockets! Cibgirlərdən özünü/özünüzü gözlə/gözləyin!*
**bewilder** [bɪ'wɪldə^r] *v* pərt etmək, utandırmaq; çaşdırmaq, karıxdırmaq, çətinliyə / çıxılmaz vəziyyətə salmaq; *Big city traffic bewilders me Böyük şəhərin gediş-gəlişi məni karıxdırır/çaşdırır; The question bewildered him Sual onu karıxdırdı / çətin vəziyyətə saldı*
**bewildered** [bɪ'wɪldəd] *adj* pərt edilmiş, utandırılmış, karıxdırılmış; çətin/çıxılmaz vəziyyətə salınmış
**bewildering** [bɪ'wɪldərɪŋ] *adj* pərtedici, utandırıcı, çaşdırıcı, karıxdırıcı, çətin vəziyyətə salan
**bewilderment** [bɪ'wɪldəmənt] *n* 1. utanma, sıxılma, çaşma, karıxma; xəcalət, pərtlik; özünü itirmə, çaşma, çaşıb qalma; heyrət; 2. qarışıqlıq, çaşqınlıq; anlaşılmazlıq, dolaşıqlıq; *Imagine my bewilderment when the girl said it Qız onu deyəndə mənim çaşqınlığımı təsəvvür et/edin*
**bewitch** [bɪ'wɪtʃ] *v* 1. ovsunlamaq, sehrləmək, cadulamaq, tilsimə salmaq; 2. məftun /valeh etmək; əsir /cəzb /bənd etmək; *The girl's sweet smile had bewitched him Qızın şirin təbəssümü onu məftun etdi / ovsunladı*
**bewitching** [bɪ'wɪtʃɪŋ] *adj* ovsunlayıcı, cadulayıcı, cəzbedici, məftunedici, valehedici; **~ smile** ovsunlayıcı/cəzbedici/məftunedici / valehedici təbəssüm
**bewitchment** [bɪ'wɪtʃmənt] *n* cadugərlik, sehrbazlıq, ovsunçuluq; məftunluq
**bey** [beɪ] *n* bəy *(titul)*
**beyond**[1] [bɪ'jɔnd] *n* o dünya, axirət dünyası; *What can we poor human beings know of the beyond Biz yazıq bəndələr o dünya/axirət dünyası haqqında nə bilirik?*
**beyond**[2] [bɪ'jɔnd] *adv* kənar, xaric, xaricində, o yana, o yanında; *I will go with you to the bridge, but not a step beyond Mən səninlə / sizinlə körpüyə qədər gedəcəm, bir addım da o yana yox;* **India and the lands ~** Hindistan və ondan o yana olan torpaqlar; *Beyond were the lakes O yanda göllər var idi*
**beyond**[3] [bɪ'jɔnd] *prep* 1. o tərəfində, arxasında, dalında: *What lies beyond the mountains? Dağların o tərəfində nə yerləşir?/var? The house is beyond the bridge Ev körpünün o tərəfindədir;* 2. artıq, o yana, o tərəfə; *Don't stay there*

*beyond midnight Orada gecəyarısından o yana qalma/qalmayın;* ~ **our country** ölkəmizdən xaricdə; *He could not be heard beyond the second row İkinci cərgədən o yana onu eşitmək olmurdu;* 3. əlavə, başqa, savayı; *I own nothing beyond the clothes on my back Əynimdəki paltarımdan başqa heç nəyim yoxdur; Beyond that, there is nothing more I can say Bundan başqa / savayı deyə biləcəyim bir şey yoxdur; He said nothing beyond what we had already knew Bizə məlum olandan əlavə / başqa / savayı o heç nə demədi; Is there any book beyond this? Bundan başqa / savayı bir kitab varmı?;* ~ **doubt** şübhəsiz, şəksiz; şübhəsiz olaraq; *This is beyond my understanding Bunu mən başa düşə bilmirəm;* **to live** ~ **one's income** öz gəliri ilə dolanmamaq, əyri yolla dolanmaq; **to go** ~ **one's authority** öz səlahiyyətini aşmaq; *It is beyond my powers Buna mənim gücüm çatmaz;* ~ **compare/comparison** müqayisə olunmayan; ~ **belief** inanılmayan; ~ **hope** ümidsiz; *It is beyond all praise Bu, tərifə gələn deyil (müsbət mənada), Bu hər cür tərifdən yüksəkdir*

**bi-** [baı-] *sifət düzəldən ön şəkilçi;* ikiqat, iki elementdən / ünsürdən ibarət: **biaxial** ikioxlu; **bipetalous** ikiyarpaqlı; **biannual** ikiillik; iki ildə bir dəfə baş verən; **bimonthly** iki ayda bir dəfə çıxan; bir ayda iki dəfə çıxan

**biannual** [baı'ænjuəl] *adj* ikiillik, bir ildə iki dəfə baş verən

**bias**[1] ['baıəs] *n* 1. meyl; 2. maillik, yatıqlıq; eniş, enişlik; 3. tərəfgirlik, üzgörənlik, qərəz, qərəzli münasibət; **political** ~ siyasi qərəzlilik; **racial** ~ irqi xurafat/zehniyyət; **without** ~ qərəzsiz; **lack of** ~ qərəzsizlik, qərəzsiz münasibət; **to have a** ~ **towards/against** *smb.* bir kəsə qarşı qərəzli münasibət bəsləmək; **to be free from** ~ qərəzsiz olmaq, üzgörənlik etməmək

**bias**[2] ['baıəs] *adj* əyri, çəpəki, çəpəki kəsilmiş

**bias**[3] ['baıəs] *v* meyllləndirmək, təhrik etmək, təsir altına salmaq; fikir yaratmaq; təsir etmək; **to** ~ *smb.* **favourably /unfavourably** bir kəsə yaxşı / pis təsir göstərmək; **to** ~ *smb.'s* **opinion** bir kəsin fikrinə/mülahizəsinə təsir etmək; **to be** ~**ed against** *smb.* bir kəsə qarşı qərəzli olmaq; **to** ~ **for the better / the worse** müsbət/mənfi təsir göstərmək

**biathlon** [baı'æθlən] *n id.* biatlon

**biaxial** [baı'æksəl] *adj* ikioxlu

**bib** [bıb] *n* 1. döşlük *(südəmər uşaqlar üçün)*; 2. döşlüyün / önlüyün yuxarı hissəsi;

◊ *one's* **best** ~ **and tucker** bir kəsin ən yaxşı paltarı

**bibb** [bıb] *n* çəftə, rəzə, tıxac, probka; kran

**bibble-babble** ['bıbl'bæbl] *n d.d.* boş danışıq, çərənçilik

**Bible** ['baıbl] *n* 1. bibliya *(tövrat və incil)*; 2. bibliyanın bir nüsxəsi; 3. stolüstü kitab; *The Oxford English Dictionary is the Bible of all the students The Oxford English Dictionary ingilis dili öyrənənlərin stolüstü kitabıdır*

**Bible-Christian** [baıbl'krıstjən] *n* əsl xristian

**Bible-clerk** ['baıbkla:k] *n* yeməkdən əvvəl bibliya oxuyan tələbə *(Oksford universitetinin kolleclərində)*

**Bible-oath** ['baıblouθ] *n* bibliyaya andiçmə

**biblic** ['bıblık] *adj* = **biblical**

**biblical** ['bıblıkəl] *adj* bibliya; ~ **legends** bibliya əfsanələri; ~ **style** bibliya üslubu; **to write in a** ~ **style** bibliya üslubunda yazmaq

**biblio-** ['bıblıou-] *mürəkkəb isimlərin komponenti;* **bibliographer** biblioqrafiya, **bibliophile** kitabsevər, kitabpərəst

**bibliographer** [.bıblı'ɔgrəfə<sup>r</sup>] *n* biblioqraf *(biblioqrafiya mütəxəssisi)*

**bibliographic** ['bıblı'ɔgræfık] *adj* = **bibliographical**

**bibliographical** [.bıblıə'græfıkəl] *adj* biblioqrafik; ~ **information** biblioqrafik məlumat

**bibliography** [.bıblı'ɔgrəfı] *n* biblioqrafiya *(müəyyən bir məsələ üzrə kitab və məqalələrin siyahısı)*

**bibliology** [.bıblı'ɔlədʒı] *n* bibliogiya, kitabşünaslıq

**bibliomania** [.bıblıou'meınjə] *n* bibliomaniya, kitabyığma həvəsi / istəyi

**bibliomanic** ['bıblıou'meınıæk] *n* kitab həvəskarı, kitab aludəsi / sevən *(adam)*

**bibliophile** ['bıblıoufaıl] *n* kitab həvəskarı *(nadir və qiymətli kitabları toplayan şəxs)*

**bibliopole** ['bıblıoupoul] *n* kitabsatan; bukinist *(köhnə və nadir kitablar alıb-satan adam və ya mağaza)*

**biblus** ['bıbləs] *n* papirus *(çoxillik tropik bitki)*

**bibulous** ['bıbjuləs] *adj* 1. nəmçəkən; ~ **paper** nəmçəkən kağız; suçəkən; 2. sərxoş, məst; kefli; sərxoşluq/əyyaşlıq edən

**bicentenary**[1] [.baısen'tı:nərı] *n* ikiyüzillik; ikiyüzillik müddət

**bicentenary**[2] [.baısen'tı:nərı] *adj* ikiyüzillik; ikiyüz il davam edən

**bicentennial** [.baısen'tenjəl] *adj* = **bicentenary**[2]

**bicker**[1] ['bıkə<sup>r</sup>] *n* 1. deyişmə, sözləşmə, çəkişmə; mübahisə etmə; mübahisə; **constant** ~ daim mübahisə; **petty** ~ kiçik mübahisə; 2. toqquşma; dalaşma, söyüşmə; 3. şırıltı, şırıldama *(çay, bulaq və s. haq)*; 4. sayrışma, titrək işıq vermə/saçma *(şam, ocaq)*

**bicker**[2] ['bıkə<sup>r</sup>] *v* 1. deyişmək, sözləşmək, sözə gəlmək, çəkişmək; mübahisə etmək; 2. dalaşmaq, savaşmaq; söyüşmək, küsüşmək; *The two children were always bickering with each other over small matters Bu iki uşaq xırda məsələlər üstündə həmişə bir-biri ilə dalaşırdı;* 3. şırıldamaq *(bulaq, çay haq.)*; 4. döymək *(yağış haq.)*; 5. sayrışmaq, titrək işıq saçmaq, səyrimək *(işıq, alov haq.)*



**bicolour** [baı'kʌlə<sup>r</sup>] *adj* ikirəngli

**bicycle**[1] ['baısıkl] *n* velosiped

**bicycle**[2] ['baısıkl] *v* velosiped sürmək

**bicycler** ['baısıklə<sup>r</sup>] *n* = **bicyclist**

**bicyclist** [baısıklıst] *n* velosipedçi, velosiped sürən

**bid**[1] [bıd] *n* 1. qiymət təklif etmə *(auksionda)*; sifariş, tələbnamə; 2. təklifedilən qiymət; qiymətə əlavə *(hərracda, alverdə)*; **higher** ~ təklif edilən daha yüksək qiymət; **last** ~ son qiymət; **to advance a** ~ qiymət üçün sifariş vermək; **to make a** ~ **for** *smth.* 1) bir şey haqqında qiymət təklif etmək; 2) bir şey almaq üçün cəhd göstərmək; 3. təklif; təklif etmə; ~ **for disarmament** tərk-silah üçün təklif; 4. cəhd; **to make a** ~ **for power** hakimiyyətə gəlmək üçün cəhd etmək; 5. dəvət, dəvət etmə; **a** ~ **to a wedding** *amer.* toya dəvət etmə

**bid**[2] [bıd] *v (pt* **bade, bid, bad;** *pp* **bidden, bid)** 1. qiymət təklif etmək *(auksionda)*; qiymətə əlavə etmək; **to** ~ **a fair price** yaxşı qiymət təklif etmək; 2. *şair* əmr etmək; xahiş etmək; *Do as you are bidden Sənə / Sizə necə əmr ediblərsə, elə də et / edin; Bid him come in Xahiş et / edin o içəri gəlsin; He bade me to sit down O xahiş etdi ki, mən oturum;* 3. arzulamaq; **to** ~ **good morning** yaxşı gün arzulamaq; **to** ~ **good bye/farewell** xudahafizləşmək, əlvida demək; 4. dəvət etmək; **to** ~ *smb.* **to dinner** bir kəsi nahara dəvət etmək;

◊ **to** ~ **beads** təsbeh çevirməklə dua oxumaq; **to** ~ **for votes** səs toplamağa çalışmaq

**biddable** ['bıdəbl] *adj* itaətli, itaətkar, sözəbaxan, sözə qulaq asan, üzüyola

**bidder** ['bıdə<sup>r</sup>] *n* müştəri, alıcı; **the highest / the best** ~ ən yüksək qiymət təklif edən müştəri / alıcı

**bidding** ['bıdıŋ] *n* 1. qiymət təklif etmə *(auksionda)*; qiymətə əlavə; *The bidding opened at $ 500 İlk qiymət 500 dollardan başladı;* 2. alver, ticarət, alver etmə; **brisk** ~ qızğın alver/ ticarət; 3. əmr, buyruq, hökm, sərəncam; əmr etmə; **to be at** *smb.'s* ~ bir kəsin sərəncamında olmaq; **to do** *smb.'s* ~ bir kəsin əmrini/sərəncamını yerinə yetirmək; 4. dəvət; çağırış

**bide** [baıd] *v (pt* **bode, bidded;** *pp* **bided, bidden)** 1. *arx.* yaşamaq; ömür sürmək, dolanmaq, güzəran sürmək; qalmaq; **to** ~ **at home** evdə qalmaq; 2. gözləmək *(imkanı, fürsəti və s.)*; **to** ~ *one's* **time** münasib vaxt / imkan gözləmək

**bidet** [bı:'deı] *n fr.* 1. atcığaz, balaca at, poni *(kiçikboylu at cinsi)*; 2. bide *(bədənin aşağı hissəsini yumaq üçün alçaq vanna)*

**biennial**[1] [baı'enıəl] *n* 1. iki ildən bir baş verən hadisə; 2. *bot.* ikiillik bitki

**biennial**[2] [baı'enıəl] *adj* iki ildən bir baş verən; ikiildə bir dəfə; ~ **election** iki ildən bir keçirilən seçki

**biennially** [baı'enıəlı] *adv* iki ildə bir, iki ildə bir dəfə

**biennials** [baı'enıəlz] *n pl bot.* ikiillik bitkilər

**bier** [bıə<sup>r</sup>] *n* 1. dəfn arabası; 2. qəbir, tabut; **to weep round** *smb.'s* ~ bir kəsin tabutu yanında hönkür-hönkür ağlamaq

**biff**[1] [bıf] *n* qəfil ağır zərbə

**biff**[2] [bıf] *v* zərbə endirmək; vurmaq; **to** ~ **s.o. on the nose** bir kəsin burnuna zərbə endirmək/vurmaq; *He biffed me on the head O mənim başıma vurdu/zərbə endirdi*

**biforked** [baı'fɔ:kt] *adj* haçalanmış; ayrılmış, aralanmış; ikiyə bölünmüş, ikilənmiş

**bifurcate**[1] ['baıfə:kıt] *adj* haçalanmış, haçalanan, ikiyə ayrılmış *(budaq, çay, yol və s. haq.)*; **a** ~ **river** haçalanmış çay

**bifurcate**[2] ['baıfə:keıt] *v* 1. haçalamaq, ikiyə ayırmaq /bölmək; 2. haçalanmaq, ikiyə ayrılmaq /bölünmək *(çay, yol, budaq)*

**bifurcated** ['baıfəkeıtəd] *adj* = **bifurcate**

**bifurcation** [.baıfə:'keıʃn] *n* 1. haçalanma, haçalama; aralama, aralanma; 2. ikiyə bölünmə/bölmə, ikiyə ayırma/ayrılma; 3. haça

**big**[1] [bıg] *adj (-gger, -ggest)* 1. böyük, iri, yekə; **a** ~ **boy** böyük oğlan; **a** ~ **box** böyük/iri/yekə qutu; **a** ~ **book** böyük kitab; **a** ~ **hotel** böyük mehmanxana; **a** ~ **game** iri/yekə ov quşu; **a** ~ **mouse** yekə/iri siçan; 2. hündür; **a** ~ **man/tree** hündür adam/ağac; 3. enli; ~ **shoulders** enli kürəklər; 4. gür, güclü, yüksək; **a** ~ **noise** gur səs; ~ **roar** yüksək nərilti; 4. hörmətli, görkəmli; **a** ~ **man** hörmətli / görkəmli adam; 5. vacib, mühüm; ~ **news** vacib/ mühüm xəbər; 6. alicənab, mərd, comərd;

◊ **the** ~ **eater** qarınqulu; ~ **mouth** *amer.* gopçu, özünü öyən; ~ **talk** lovğalıq, gopçuluq; ~ **toe** baş barmaq *(ayaqda)*; **to be/to get/to grow too** ~ **for** *one's* **boot /shoes** iddia satmaq, təkəbbürlənmək, özünü çəkmək, lovğalanmaq

**big**[2] [bıg] *adv d.d.* lovğalıqla, lovğa-lovğa; **to talk** ~ lovğalanmaq, lovğa-lovğa danışmaq, özünü öymək, özünü tərifləmək, gopa basmaq

**bigam(e)** ['bıgəm] *n* ikiarvadlı kişi, ikiərli arvad

**bigamist** ['bıgəmıst] *n* ikiarvadlı *(kişi)*; ikiərli *(arvad)*

**bigamous** ['bıgəməs] *adj* ikiarvadlı; ikiərli

**bigamy** ['bıgəmı] *n* ikiarvadlılıq; ikiərlilik; *Bigamy is considered a crime in many countries İkiarvadlılıq / İkiərlilik bir çox ölkələrdə cinayət hesab edilir*

**big-name** [bıgneım] *adj* 1. məşhur, tanınmış; ~ **guests at a hotel** mehmanxanada yaşayan tanınmış / məşhur adamlar; 2. görkəmli, məşhur; **a** ~ **novel** görkəmli / məşhur roman, məşhur yazıçı tərəfindən yazılmış roman

**bigness** [bıgnıs] *n* 1. böyüklük, əzəmət; 2. həcm

**bigot** ['bıgət] *n* kor-koranə inanan, fanatik, təəssübçü; mövhumatçı

**bigoted** ['bɪɡətɪd] *adj* fanatikcəsinə; fanatik
**bigotry** ['bɪɡətrɪ] *n* kor-koranə inanma; fanatizm; mövhumat
**big sister** [ˌbɪɡsɪstə'] *n* böyük bacı
**big time**[1] [bɪɡtaɪm] *amer. d.d.* **1.** müvəffəqiyyət; nailiyyət *(xüs. idmanda və estrada tamaşalarında)*; **2.** ən əla / ekstra növ; **footballer breaking into the ~** ən əla / ekstra futbolçu
**big time**[2] ['bɪɡtaɪm] *adj* **1.** hay-küylü müvəffəqiyyət qazanmış; **2.** çox yaxşı/gözəl / qəşəng; tanınmış, görkəmli; **~ singer** çox yaxşı / tanınmış / görkəmli müğənni
**big timer** ['bɪɡtaɪmə'] *n* **1.** məşhurluq, şöhrət; **2.** əla növ aktyor / idmançı
**bigwig** ['bɪɡwɪɡ] *n isteh.* böyük adam / şəxs *(kinayə ilə işlədilir)*
**bihourly** [baɪ'auəlɪ] *adj amer.* iki saatda bir, hər iki saatdan bir
**bijou**[1] ['bɪ:ʒu:] *n (pl* **bijoux** [bɪ:ʒu:z]) *fr.* **1.** daş-qaş, qızıl-gümüş, cavahirat; qiymətli şey; **2.** zinət, bəzək-düzək
**bijou**[2] ['bi:ʒu:] *adj fr.* balaca və incə; balaca, kiçicik, zərif; **~ camera** balaca və zərif fotoaparat
**bijouterie** [bɪ'ʒu:təri:] *n fr.* **1.** daş-qaş, qızıl-gümüş, cəvahirat; **2.** zinət, bəzək-düzək şeyləri
**bike**[1] [baɪk] *n d.d.* velosiped
**bike**[2] [baɪk] *v* velosiped sürmək / minmək
**bikini** [bɪ'ki:nɪ] *n d.d.* bikini *(qadınlar üçün çox qısa tumanlı çimərlik paltarı)*
**bilabial** [baɪ'leɪbjəl] *adj dilç.* dodaqlanan; **~ sound** dodaqlanan səs; *The English sound for [b] is bilabial [b] səsi ingilis dilində dodaqlanandır*
**bilateral** [baɪ'lætərəl] *adj* ikitərəfli; **~ connection** ikitərəfli əlaqə; **~ treaty** ikitərəfli müqavilə; **~ agreement** ikitərəfli razılaşma/saziş
**bilberry** ['bɪlbərɪ] *n bot.* **1.** qaragilə kolu; **2.** qaragilə *(meyvəsi)*
**bile**[1] [baɪl] *n* **1.** öd; **2.** əsəbilik, tündməcazlıq; səbirsizlik
**bile**[2] [baɪl] *adj* öd; **~ cyst** *anat.* öd kisəsi; **~ duct** *anat.* öd kanalı / axacağı
**bile-stone** ['baɪlstoun] *n tib.* öd daşı
**biliary** ['bɪljərɪ] *adj* öd; **~ calculus** *tib.* öd daşı; **~ colic** *tib.* öd sancısı
**bilingual**[1] [baɪ'lɪŋɡwəl] *n* iki dildə danışan adam
**bilingual**[2] [baɪ'lɪŋɡwəl] *adj* **1.** iki dilli; iki dildə yazılmış; **~ Azerbaijani-English dictionary** iki dilli Azərbaycanca-İngiliscə lüğət; **2.** iki dildə danışan
**bilious** ['bɪljəs] *adj* **1.** = **biliary**; **2.** *tib.* öd daşması; **~ attack** öd axını nəticəsində tutma; **~ patient** öd axını ilə əziyyət çəkən xəstə; **3.** tez-acıqlanan, tezhirslənən, tündməcaz, əsəbi; **4.** çox pis, iyrənc; **~ weather** çox pis / iyrənc hava
**biliously** ['bɪljəslɪ] *adv* əsəbi, acıqlı; acıqlı-acıqlı, əsəbi-əsəbi

**biliousness** ['bɪljəsnɪs] *n* **1.** ətiacılıq, qanıacılıq, tündlük; **2.** tez acıqlanma /hirslənmə, tündməcazlıq, əsəbilik
**bilk**[1] [bɪlk] *n* **1.** fırıldaq, fırıldaqçılıq, kələkbazlıq; yalan, hiylə; kələk; **2.** cəfəngiyyat, mənasız söz
**bilk**[2] [bɪlk] *v* aldatmaq, boyun qaçırmaq *(borcu verməkdən və s.)*
**bilker** ['bɪlkə'] *n* kələkbaz, fırıldaqçı, adamaldadan, dələduz
**bill**[1] [bɪl] *n* I **1.** dimdik; **the ~ of a bird** quş dimdiyi; **2.** *coğ.* burun; **Portland Bill** Portlənd burnu
**bill** [bɪl] *n* II **1.** hesab; *Have you paid the hotel bill? Sən/Siz mehmanxananın haqqını ödəmisənmi/ödəmisinizmi?* **padded ~s** şişirdilmiş hesablar; **payable ~s** ödənilməli hesablar; **to meet a ~** hesabı ödəmək; **2.** siyahı; **to make out a ~** siyahı tərtib etmək; **3.** sənəd; **~ of health** sağlamlıq haqqında sənəd; **~ of credit** akkreditiv *(əmanət kassasına qoyulan pulu başqa əmanət kassalarından almaq üçün sənəd)*; **~ of debt** borcla əlaqədar verilmiş kağız; **~ of sale** kupçi kağızı *(yer, mülk kağızı)*; **~ of entry** gömrük deklarasiyası; **4.** bill *(İngiltərədə və ABŞ-da: parlamentin müzakirəsinə verilən qanun layihəsi)*, qanun layihəsi; **private ~** məhəlli məna kəsb edən qanun layihəsi; **to introduce / to bring in a ~** qanun layihəsi təklif etmək/irəli sürmək; **to pass a ~** qanun layihəsini qəbul etmək; **to throw out a ~** qanun layihəsini rədd etmək; **5.** proqram *(teatrın, konsertin və s.)*; **to change (the) ~** proqramı dəyişmək; **to head/to top the ~** proqramın məğzini/əsasını təşkil etmək; **6.** afişa, plakat; **7.** *amer.* banknot *(bank tərəfindən buraxılan faizsiz kredit bileti)*; xəzinə bileti, kağız pul; **five-dollar ~** beş dollarlıq xəzinə bileti / kağız pul; **8.** veksel *(borc sənədi)*; **short(-dated) ~** qısamüddətli veksel; **9.** *hüq.* iddia, tələb; **~ of complaint** iddia ərizəsi; **~ of review** məhkəmənin qərarını dəyişmək haqqında iddia/tələb; **to ignore the ~** işə *(məhkəmə işinə)* xitam vermək; **10.** ali rütbəli şəxsə ünvanlanmış yazılı ərizə
**bill**[2] [bɪl] *v* I dimdik-dimdiyə öpüşmək *(göyərçinlər haq)*; **to ~ and coo** sevişmək, bir-birini oxşamaq, bir-birini əzizləmək / nazlamaq
**bill** [bɪl] *v* II **1.** afişa vasitəsi ilə elan etmək; *Irving was billed to appear as Hamlet Elan olundu ki, İrvinq Hamlet rolunda oynayacaq;* **2.** afişa yapışdırmaq; **3.** hesab yazmaq; hesab göndərmək; *I can't pay now; Please bill me for it later Mən indi ödəyə bilmirəm; zəhmət olmasa, hesabı mənə sonra göndər/göndərin;* **4.** faktura yazmaq; **5.** elan etmək; **6.** şikayət vermək
**billboard** ['bɪlbɔ:d] *n* I bildiriş və elanlar üçün lövhə
**billboard** ['bɪlbɔ:d] *n* II *dən.* lövbər yastığı
**billet**[1] ['bɪlɪt] *n* I **1.** *hərb.* əsgərlərin yerləşdirilməsi üçün mənzil/ev/yer; **2.** əsgərləri xüsusi



evlərdə müvəqqəti yerləşdirmə; **3.** vəzifə; **good/bad ~** yaxşı/pis maaşlı vəzifə
**billet** ['bɪlɪt] *n* II kötük, girdin, ağac lövhə
**billet**[2] ['bɪlɪt] *v hərb. (mənzillərdə)* yerləşdirmək *(əsgərləri); The soldiers were billeted at/in a village Əsgərlər kənddə yerləşdirildi; The soldiers were billeted on / upon the villagers Əsgərlər kəndlilərin evlərində yerləşdirildilər; The captain billeted his soldiers on old Mr Smith Kapitan əsgərlərini qoca Smitin evində yerləşdirdi*
**billet-doux** [ˌbɪleɪ'du:] *n fr. (pl* **billets-doux**) sevgi /məhəbbət məktubu
**billiard** ['bɪljəd] *adj* bilyard; **a ~ table** bilyard stolu; **a ~ ball** bilyard şarı
**billiard-cue** ['bɪljədkju:] *n* kiy *(bilyard oynamaq üçün ağac)*
**billiard-room** ['bɪljədru:m] *n* bilyardxana, bilyard otağı, bilyard oynanılan otaq
**billiards** [bɪljədz] *n pl* bilyard
**billiard-table** ['bɪljədˌteɪbl] *n* bilyard stolu
**billion** ['bɪljn] *n* **1.** billion *(İngiltərədə)*; **2.** milyard *(Amerikada, Fransada)*
**billionaire** [ˌbɪljə'neə] *n* milyarder
**billman** ['bɪlmən] *n (pl* **-men** [-mən]) toxa / kərki ilə işləyən fəhlə
**billon** ['bɪlən] *n* billon *(aşağı əyarlı gümüş və ya qızıl)*
**billow**[1] ['bɪlou] *n şair.* **1.** böyük dalğa, güclü ləpə; **2.** sürətli axın, sel; **3.** dəniz, dərya
**billow**[2] ['bɪlou] *v şair.* qabarmaq, yuxarı qalxmaq; dalğalanmaq, ləpələnmək
**billowy** ['bɪlouɪ] *adj* **1.** qabaran, yuxarı qalxan *(dalğa və s. haq.)*; **~ skirts** *d.d.* enli/ qabaran yubka; **2.** dalğalı, kələ-kötür *(yer haq.)*
**bill-poster** ['bɪlˌpoustə'] *n* **1.** afişa / bildiriş yapışdıran; **2.** afişa, plakat
**bill-sticker** ['bɪlˌstɪkə'] *n* = **bill-poster**
**billy** ['bɪlɪ] *n* **1.** polis dəyənəyi; **2.** *düşərgədə xörək bişirmək, yaxud su qaynatmaq üçün tənəkə qazan*
**billyboy** ['bɪlɪbɔɪ] *n* yelkənli sahil gəmisi, bir göyərtəli barja
**billy-goat** ['bɪlɪɡout] *n* erkək keçi, təkə
**bim** [bɪm] *n amer.* **1.** arvad, qadın; qız; **2.** gəzəyən qadın / arvad, fahişə, qəhbə
**bimonthly**[1] [baɪ'mʌnθlɪ] *adj* ikiayda bir baş verən / çıxan; **a ~ magazine** ikiayda bir çıxan jurnal
**bimonthly**[2] [baɪ'mʌnθlɪ] *adv* ikiayda bir; ayda iki dəfə
**bimotored** [baɪ'moutəd] *adj* ikimotorlu, ikimühərrikli
**bin**[1] [bɪn] *n* **1.** daqqa, iri yeşik/sandıq; anbar; bunker; rezervuar, çən; **2.** qab; **a bread ~** çörək qabı; **a rubbish ~** zibil qabı; **3.** səbət *(mayaotu yığmaq üçün)*; **4.** qəfəs *(şərab anbarında butulka yığmaq üçün)*; **5.** şərab növü; **6.** silos quyusu
**bin**[2] [bɪn] *v* daqqada / anbarda / bunkerdə / çəndə saxlamaq

**binary** ['baɪnərɪ] *adj* ikiqat; qoşalanmış, ikiləşmiş, ikiqat edilmiş; **~ stars** *astr.* qoşalaşmış ulduzlar
**bind**[1] [baɪnd] *n* sıxıntı, darıxma, üzüntü; zəhlətökən / bezikdirici / usandırıcı iş
**bind**[2] [baɪnd] *v (pt, pp* **bound**) **1.** bağlamaq; **to ~ hand and foot** əl və ayaqlarını bağlamaq; *Bind the prisoner's arms Dustağın əllərini bağla/bağlayın;* **2.** bir yerə toplayıb bağlamaq; *She bound (up) her hair O, saçını bir yerə toplayıb bağladı;* **3.** sarımaq; **to ~ (up) wounds** yaranı sarımaq; **4.** bənd etmək, bağlamaq; *The dog was bound to the tree İt ağaca bağlanmışdı;* **5.** cild çəkmək, cildləmək *(kitabı və s.)*; **to ~ a book** kitab cildləmək; *I have my book bound Mən kitabımı cildlətdirmişəm;* **6.** haşiyələmək, köbələmək, köbə tikmək; *The edge of the carpet was worn out, so we had it bound Xalçanın qırağı sökülüb, biz onun kənarını köbələtdik;* **7.** bərkitmək, bərk etmək; *Frost binds the ground in winter Qışda şaxta torpağı bərkidir; Clay binds when it is heated Qızdırıldıqda gil bərkiyir;* **8.** mədəni bərkitmək, qəbz etmək; **9.** məcbur/vadar etmək, öhdəsinə qoymaq, bir vəzifə olaraq tapşırmaq *(qanunda və s.)*; bağlamaq, əlaqələndirmək *(müqavilə və s. ilə)*; *His words binds him to good behaviour Verdiyi sözlər onu yaxşı davranmağa vadar edir; The court's decision binds them to pay the fine Məhkəmənin qərarı onları cərimə verməyə vadar/məcbur edir;* **10.**: **to ~ oneself** öhdəsinə götürmək; *He bound himself to take part in the expedition O, ekspedisiyada iştirak etmək haqqında üzərinə təəhhüd götürdü;* **11.** təsdiq etmək, imzalamaq; **to ~ a bargain** sazişi/razılaşmanı təsdiq etmək, **to be bound to do** *smth.* bir işi görmək üçün mənəvi borc hiss etmək; *He is bound to come O, hökmən gələcək; He is bound to find a way out O, hökmən çıxış yolu tapacaq;* **to be bound to be/to happen** hökmən baş verməsi labüd olmaq; *It is bound to happen Bu hökmən baş verəcək/olacaq; It is bound to rain tomorrow Sabah hökmən yağış yağacaq;* **to be bound by** *smth.* bir şeylə bağlı olmaq; *He is bound by a promise O, vədlə bağlıdır;* **to be bound for some place** bir yerə istiqamət almaq/götürmək; *The ship is bound for Batumi Gəmi Batumiyə gedir;* **to be bound up in** *smth./smb.* özünü bir işə / bir kəsə həsr etmək; *She is bound up in her work O özünü bütünlüklə işinə həsr edib*
**binder** ['baɪndə'] *n* **1.** cildçi; *My book is still at the binder's Mənim kitabım hələ də cildçidədir;* **2.** bağlayan *(dərz və s.)*; **3.** sarıq, sarğı; ip, kəndir; bağ; **4.** cild, üz; qovluq *(qəzet, jurnal və s. üçün)*
**bindery** ['baɪndərɪ] *n* cildxana
**binding**[1] [baɪndɪŋ] *n* **1.** cildləmə; cildləmə işi; *Binding is hard to learn Cildləmə işini öyrənmək çətin işdir;* **2.** cild; *The binding of this book is torn Bu kitabın cildi cırılıb*

**binding²** [ˈbaındıŋ] *adj* 1. əlaqələndirən, əlaqə yaradan; ~ **effect** əlaqələndirən təsir; 2. büzücü, büzüşdürücü; ~ **agent / medium** büzüşdürücü / büzücü vasitə; 3. bir vəzifə kimi tapşırılan, məcburi, vacib; *A promise given under compulsion is not binding Məcburiyyət altında verilmiş vəd məcburi ola bilməz*

**bindweed** [ˈbaındwi:d] *n bot.* sarmaşıq *(alaq otu)*

**binge** [bındʒ] *n* kef, eyş-işrət, içki məclisi; *They went on a binge last night and didn't get back till 3 in the morning Onlar dünən axşam kefə getdilər və səhər saat 3-ə kimi qayıtmadılar*

**bingo** [ˈbıŋgou] *n* binqo *(lotoya oxşar oyun növü)*

**binnacle** [ˈbınəkl] *n* naktouz *(gəmidə kompas yerləşdirilən şkaf)*

**binocular** [bıˈnɔkjulə] *adj:* ~ **vision** iki gözlə görmə

**binoculars** [baıˈnɔkjuləz, bıˈnɔkjuləz] *n pl* binokl, durbin; *I watched the horse-race through my binoculars Mən cıdır yarışını durbinimlə müşahidə etdim*

**binomial¹** [baıˈnoumjəl] *n riyaz.* binom, ikihədli

**binomial²** [baıˈnoumjəl] *adj riyaz.* binomial, ikihədli; ~ **equation** ikihədli tənlik

**bio-** [baıou-] *terminoloji xarakterə malik mürəkkəb sözlərin tərkib hissəsi: məs.* **biology** biologiya, **biochemistry** biokimya və s.

**biochemical** [ˈbaıouˈkemikəl] *adj* biokimyəvi

**biochemist** [ˈbaıouˈkemist] *n* biokimyaçı

**biochemistry** [ˈbaıouˈkemistrı] *n* biokimya

**biogenetic** [ˈbaıoudʒıˈnetık] *adj* biogenetik

**biogeography** [ˈbaıoudʒıˈɔgrəfı] *n* biocoğrafiya

**biographer** [ˈbaıougra:fəʳ] *n* bioqraf *(tərcümeyi-hal yazan)*

**biographic** [ˌbaıouˈgræfık] *adj* bioqrafik; tərcümeyi-hala aid

**biographical** [ˌbaıouˈgræfıkəl] *adj* = **biographic**

**biography** [baıˈɔgrəfı] *n* bioqrafiya, tərcümeyi-hal

**biologic** [ˌbaıəˈlɔdʒık] *adj* = **biological**

**biological** [ˌbaıəˈlɔdʒıkəl] *adj* bioloji; ~ **environment** bioloji mühit; ~ **warfare** bioloji müharibə; ~ **ripeness** bioloji/fizioloji yetkinlik

**biologist** [baıˈɔlədʒıst] *n* bioloq *(biologiya mütəxəssisi)*

**biology** [baıˈɔlədʒı] *n* biologiya

**biosphere** [baıəsfıəʳ] *n* biosfera *(yer üzündə həyat olan sahə)*

**biophysics** [ˌbaıəˈfızıks] *n* biofizika; bioloji fizika *(fizikanı biologiyaya tətbiq etməklə məşğul olan elm)*

**biplane** [ˈbaıpleın] *n av.* biplan *(üst-üstə qoşaqanadlı təyyarə)*

**birch¹** [bə:tʃ] *n* 1. *bot.* tozağacı; 2. çubuq, şüvül; 3. *toxuc.* məkik, mazura

**birch²** [bə:tʃ] *v* çubuqla / şüvül ilə döymək *(cəza olaraq)*

**birchen** [ˈbə:tʃən] *adj* tozağacı, tozağacından qayrılmış / hazırlanmış

**bird¹** [bə:d] *n* 1. quş; ~ **of passage** köçəri quş *(həm də insan haq.)*; ~ **of prey** vəhşi quş; 2. yüngülxasiyyət arvad, qız; 3. oğlan, adam; 4. *d.d.* uçan aparat, təyyarə, idarəolunan raket; 5. *amer.* hərbi təyyarəçi;

◊ ~ **of Juno** tovuz; ~ **of wonder** simurq; **a ~ of *one's* own brain** özünün şəxsi fikri/ideyası; **to do *smth.* like a ~** bir işi quş kimi görmək; **a ~ in the bush** ≅ dəryada balıq; **a ~ in the hand** həqiqətdə əldə olan; *A bird in the hand is worth two in the bush at. söz.* ≅ *Soğan olsun, nağd olsun; Birds of a feather flock together at. söz. Taylı tayını tapar;* **to kill two ~s with one stone** bir oxla iki dovşan vurmaq

**bird²** [bə:d] *v* ovlamaq, tutmaq *(quşu və s.)*

**bird-brained** [ˈbə:dbreınd] *adj* quşbeyin, başıboş; **a ~ man** quşbeyin adam / kişi

**bird-cage** [ˈbə:dkeıdʒ] *n* quş qəfəsi

**bird-call** [ˈbə:dkɔ:l] *n* 1. quş səsi, quşların çıxardığı səs; oxuma; 2. ovçu tütəyi, sümsü *(quşları aldadıb çağırmaq üçün alət)*

**bird-cherry** [ˈbə:d.tʃerı] *n bot.* gilas, şirin gilas

**bird-dog** [ˈbə:ddɔg] *n* 1. quş ovuna öyrədilmiş tula; 2. axtarıcı it; xəfiyyə

**birder** [ˈbə:dəʳ] *n* quşçu *(quşçuluq mütəxəssisi)*

**bird-fancier** [ˈbə:d.fænsıəʳ] *n* 1. quşbaz, quş sevən; 2. quş satan

**birdie** [ˈbə:dı] *n* 1. quşcuğaz, balaca quş, quş balası

**bird-lime** [ˈbə:dlaım] *n* quş yapışqanı *(quş tutmaq üçün budağa yaxılan yapışqan)*

**bird-nest** [ˈbə:dnest] *n* quş yuvası

**bird of paradise** [bə:dəvˈpærədaıs] *n zool.* cənnət quşu

**bird-seed** [ˈbə:dsi:d] *n* quş yemi

**bird's-eye** [ˈbə:dzaı] *n bot.* novruzgülü

**bird's-nest** [ˈbə:dznest] *n* quş yuvası

**bird-watch** [ˈbə:dwɔtʃ] *v* quşları təbii şəraitdə müşahidə etmək / öyrənmək

**birth¹** [bə:θ] *n* 1. doğma, doğulma, doğum, doğuluş; **the ~ of a child** uşağın doğulması; ~, **marriage and death** doğuluş, evlənmə və ölüm; *Last year there were more births than death Keçən il ölümdən daha çox doğum olmuşdur; She weighed 8 pounds at birth Doğularkən onun çəkisi 8 funt olmuşdur;* **to give ~ to** doğmaq; **to give ~ to a child** uşaq doğmaq; *She gave birth to a fine healthy baby O, qəşəng və sağlam bir uşaq doğdu;* 2. başlanğıc; **to crush a movement at ~** hərəkatı başlanğıcda boğmaq; 3. əsil, mənşə; yaranma, əmələ gəlmə; **the ~ of an idea** ideyanın yaranması; **of noble ~** alicənab mənşə, əsil-nəcabət; **French by ~** mənşəcə fransız; **English by ~** mənşəcə / əslən ingilis

**birth²** [bə:θ] *v* doğmaq

**birth control** [ˈbə:θkən.troul] *n* doğumu tənzimləmək; hamiləliyin qarşısını almaq üçün tədbirlər



**birthday** [ˈbə:θdeı] *n* ad günü, doğum günü; *When is your birthday? Sənin / Sizin ad günün / ad gününüz nə vaxtdır? Happy birthday to you! Ad günün / gününüz mübarək olsun!*

**birthmark** [ˈbə:θma:k] *n* xal *(anadangəlmə)*

**birthnight** [ˈbə:θnaıt] *n* doğum gecəsi

**birthplace** [ˈbə:θpleıs] *n* doğulduğu yer, vətən, yurd; *Ganja is the birthplace of Great Nizami Gəncə böyük Nizaminin vətənidir / doğulduğu yerdir*

**birthrate** [ˈbə:θreıt] *n* doğum sayı, doğum əmsalı

**birthright** [ˈbə:θraıt] *n* 1. ilkinlik hüququ; 2. *hüq.* anadangəlmə hüquq; *It is yours by birthright Anadangəlmə hüquqa görə bu sənindir/sizindir;* 3. *məc.* alınmaz/alına bilməz/alınması mümkün olmayan hüquq

**biscuit** [ˈbıskıt] *n* 1. quru peçenye, **water ~** qalet; **ship's ~** suxarı; 2. açıq palıdı rəng

**bisect** [baıˈsekt] *v* iki bərabər hissəyə bölmək, tən bölmək

**bisection** [baıˈsekʃn] *n* tən bölünmə, ikiyə bölünmə

**bisexual** [ˌbaıˈsekʃuəl] *adj* ikicinsli

**bishop** [ˈbıʃəp] *n* 1. yepiskop *(baş keşiş)*; 2. *şahm.* fil

**bismuth** [ˈbızməθ] *n kim.* bismut *(kimyəvi element)*

**bison** [ˈbaısn] *n zool.* bizon *(vəhşi öküz)*

**bissextile** [bıˈsekstaıl] *n* 1. uzun il *(hər dörd ildən bir günlərinin sayı 366 gün olan il)*; 2. uzun ilin artıq günü

**bisque** [bısk] *n* toyuq və ya krolik ətindən bişirilmiş şorba

**bit¹** [bıt] *n* I 1. cilov, çaralğa *(yüyənin atın ağzına verilən dəmir hissəsi)*; **to draw ~** 1) cilovu çəkmək, atı əyləmək; 2) sürəti azaltmaq; 2. burğu; burov *(qazma maşını)*; 3. qələm *(dəmir və daş yonmaq üçün alət)*; 4. lehim alətinin başı;

◊ **to take the ~ between *one's* teeth** ≅ zəncir çeynəmək; baş götürüb qaçmaq *(at haq.)*

**bit** [bıt] *n* II 1. parça, hissə; tikə; bir tikə / parça; **~s of sugar** qənd parçaları; **small ~s of plaster** suvaq parçaları; **every ~ of the food** yeməyin hər bir tikəsi; *He read all the interesting bits in the newspaper O, qəzetdə olan bütün maraqlı parçaları oxudu; She ate all the cake bit by bit O, parça-parça bütün pirojnanın hamısını yedi; Give me a bit Mənə bir parça / tikə ver/verin;* 2. bir az; **a ~ at a time** hər dəfə bir az; *I am a bit tired Mən bir az yorğunam / yorulmuşam; He is a bit late O, bir az gecikib;* **not a ~** heç, əsla; *He is not a bit tired O əsla / heç yorulmayıb;*

◊ ~ **by ~** yavaş-yavaş, tədriclə, tədricən; **to do *one's* ~** öz borcunu yerinə yetirmək

**bit²** [bıt] *v* I 1. cilovlamaq, yüyənləmək; 2. cilovunu çəkmək, saxlamaq, qarşısını almaq

**bit** [bıt] *n* II **to bite** *felinin pt, pp formaları*

**bitbrace** [ˈbıtbreıs] *n* burğu, matqab

**bitch¹** [bıtʃ] *n* 1. qancıq, dişi; 2. *kob.* qancıq; **son of a ~** qancıq oğlu; *That son of a bitch stole my car O, qancıq oğlu mənim maşınımı oğurladı; You son of a bitch! Qancıq oğlu! İt oğlu!*

**bitch²** [bıtʃ] *v* şikayət etmək, şikayətlənmək, donquldanmaq, deyinmək, söylənmək, mırtıldamaq

**bitchiness** [bıtʃınıs] *n* 1. qancıqlıq; 2. şikayət, donquldanma, mırıldanma, deyinmə

**bitchy** [ˈbıtʃı] *adj* qeybətedən, sözbaz, sözgəzdirən, sözdüzəldən *(adam haq.)*; **a ~ person** sözbaz/sözgəzdirən adam

**bite¹** [baıt] *n* 1. dişlək, dişləmə; dişlək yeri; yara; **insect ~** həşərat dişləyi; *Her face was covered with insect bites Onun üzü həşərat dişləyi ilə örtülmüşdü;* **to take a ~** bir dişlək götürmək; *He took a bite out of the apple O, almadan bir dişlək götürdü;* 2. bir tikə; *He is hungry because he hasn't had a bite all day O, acdır, çünki o, səhərdən ağzına bir tikə də almayıb;* 3. tilova gəlmə *(balıq haq.)*; 4. yüngül yemək; **to have ~** qəlyanaltı etmək; 5. kəskin ağrı; sancı; **the ~ of the wound** yaranın sancısı; 6. kələkbaz, hiyləbaz, fırıldaqçı, cibgir; 7. kəskinlik, acılıq; *There is a bite in this cold wind Bu soyuq küləkdə bir kəskinlik var; I like cheese with more bite in it Mən daha kəskin pendiri xoşlayıram; Her words had a cruel bite to them which we all felt keenly Onun sözlərində amansız kinayə / kəskinlik vardı; bunu biz hamımız aydınca hiss etdik*

**bite²** [baıt] *v (pt* **bit**, *pp* **bitten** [ˈbıtn], **bit***)* 1. dişləmək, tutmaq, qapmaq; *The dog bit the postman İt poçtalyonu dişlədi / tutdu; Does your dog bite? Sənin / Sizin itin / itiniz qapırmı?;* 2. yemək, dişləmək *(həşərat haq.)*; *Mosquitoes bit the child last night Ağcaqanadlar uşağı keçən gecə yeyib / dişləyib;* 3. vurmaq, çalmaq *(ilan və s. haq.)*; *Be careful, the snake will bite you Ehtiyatlı ol/olun, ilan səni / sizi vurar / çalar;* 4. tilova gəlmək *(balıq haq.)*; *I've been sitting here for hours but the fish just aren't biting today Mən neçə saatdır ki, burada oturuuram, lakin balıq bu gün tilova gəlmir;* 5. ağrıtmaq; yandırmaq *(istiot və s. haq.)*; 6. yandırmaq, göynətmək *(soyuq və s. haq.)*; *The icy wind bites fingers Şaxtalı külək barmaqları göynədir;* 7. tutmaq; yapışmaq; *The roads are covered with thick ice, the break will not bite Yollar qalın buzla örtülüb, tormoz tutmayacaq;* 8. fikir vermək, maraq göstərmək; *I hoped he would be interested in my plan, but he didn't bite Mən ümid edirdim ki, o mənim planımla maraqlanacaq, lakin o fikir vermədi/maraq göstərmədi;*

◊ **to ~ off more than one can chew** gücü çatmayan işdən yapışmaq; gücünü hesablamamaq; **to ~ *one's* lips** dodaqlarını dişləmək, əsəbiləşmək; **to ~ the tongue** dilini dişləmək; susmaq.

dinməmək; **to ~ the dust / the ground / the sand 1)** öldürülmək; 2) üzüqoylu/üzüüstə düşmək; səcdə etmək, təhqir olunmaq, məğlub olmaq; *Once bitten twice shy at. söz. ≅ İlan vuran ala çatıdan qorxar*

**biting** ['baitiŋ] *adj* 1. kəskin, güclü; **a ~ wind** kəskin/güclü külək; 2. acı, zəhərli, kinayəli; **~ words** acı / zəhərli sözlər; **~ satire** acı / kəskin satira

**bitten** ['bitn] **to bite** *felinin pp forması*

**bitter**[1] ['bitəʳ] *n* acı pivə

**bitter**[2] ['bitəʳ] *adj* 1. acı; **~ taste** acı dad; **~ almond** acı badam; **the ~ truth** acı həqiqət; 2. qəddar; amansız; **~ enemies** qəddar düşmənlər; 3. bərk, dəhşətli; **~ cold** bərk / dəhşətli soyuq, bərk şaxta;

◊ **to the ~ end** son həddə qədər, lap sona kimi/qədər; **to fight to ~ end** ölənə qədər / kimi vuruşmaq, sona qədər / kimi vuruşmaq; **~ as gall** öd kimi acı

**bitter**[3] ['bitəʳ] *v* acı dad vermək/ dadmaq

**bitter-cress** ['bitəkres] *n bot.* vəzəri *(bitki)*

**bitterly** ['bitəli] *adv* 1. acı-acı; 2. bərk, çox; *It was bitterly cold Çox / Bərk soyuq idi*

**bittern** ['bitən] *n zool.* danquşu

**bitterness** ['bitənis] *n* acılıq, acı təm

**bitters** ['bitəz] *n* 1. acı dərman; 2. araq, acı araq

**bitter-sweet**[1] ['bitəswi:t] *n* kədərlə qarışıq sevinc; **~(s) of daily life** gündəlik həyatın kədəri və sevinci

**bitter-sweet**[2] ['bitəswi:t] *adj* acılı-şirinli; şirin-acı, acı ilə qarışıq şirin; **~ memories of my childhood** uşaqlığımın acılı-şirinli xatirələri

**bitumen** ['bitju:min] *n* bitum, asfalt

**bituminous** [bi'tju:minəs] *adj* bitumlu; asfalt; **~ concrete** asfaltbeton; **~ coal** bitumlu daş kömür

**bivalent** ['baiveilənt] *adj* ikivalentli

**bivocal** [bai'voukəl] *n fon.* ikisaitli, diftonq

**bi-weekly**[1] ['baiwi:kli] *n* iki həftədə bir dəfə çıxan jurnal / qəzet

**bi-weekly**[2] ['baiwi:kli] *adj* ikihəftəlik; həftədə iki dəfə çıxan; **a ~ magazine** ikihəftəlik jurnal, iki həftədə bir dəfə çap edilən jurnal; həftədə iki dəfə çıxan jurnal

**bizarre** [bi'za:] *adj* qəribə, təəccüblü; qeyri-adi, əcaib

**bizonal** [bi'zounl] *adj* ikizonalı

**blab** [blæb] *n* 1. boşboğaz, çoxdanışan, söz saxlamayan; 2. boşboğazlıq, boş danışıq, boş söhbət

**blab** [blæb] *v (-bb-)* 1. boşboğazlıq etmək, çənə vurmaq, laqqırtı vurmaq, çərənləmək; 2. ağzından qaçırtmaq, demək, yaymaq, demək *(sirri)*; xəbərçilik etmək, çuğullamaq; *Here come the police! Someone must have blabbed Budur polis gəlir! Yəqin ki, kimsə xəbərçilik edib!*

**blabber** ['blæbəʳ] *n* boşboğaz, çoxdanışan, çərənçi, söz saxlamayan, xəbərçi

**black**[1] [blæk] *n* 1. qaralıq, qara rəng; 2. qara boya / rəng; 3. qara don, matəm paltarı; *After her husband's death, she dressed in black for a year Ərinin ölümündən sonra o, bir il qara paltar geydi;* 4. çirk, his, qara ləkə; *You have some black on your hand Sənin/Sizin əlində/əlinizdə qara ləkə var;* 5. qaradərili *(zənci)*; 6. *hərb.* hədəfin orta hissəsi / qara hissəsi;

◊ **to swear/to prove ~ is white** qaraya ağ demək; **to be in the ~ 1)** gəlirlə iş aparmaq, gəlir qazanmaq; 2) alıcılıq qabiliyyəti olmaq, ödəmə bacarığı olmaq; varlı / pullu olmaq; **to go into ~** mənfəət gətirməyə başlamaq, rentabelli olmaq

**black**[2] [blæk] *adj* 1. qara; **~ suit/coat/trousers/shirt, *etc.*** qara kostyum/palto/şalvar / köynək *və s.*, **~ diamond** qara almaz; **~ powder** qara barıt; **~ clouds** qara buludlar; **~ iron** qara metal; **~ race** qara irq; 2. qaranlıq; **~ night** qaranlıq gecə; 3. çirkli; kirli; **~ hands** çirkli/kirli əllər; *Your hands are black! Go and wash them Sənin/Sizin əlin/əliniz çirklidir! Get/Gedin yu/yuyun;* **~ linen** çirkli/kirli dəyişək; 4. ümidsiz, kədərli, qəmgin, qaşqabaqlı; *Things look black İşlər ümidsiz vəziyyətdədir;* 5. qorxulu, dəhşətli; ağır; **~ deed** qorxulu iş, çirkin hərəkət; **~ heart** cani, cinayətkar, yaramaz; **~ sins** ağır günahlar; **~ moments** ağır dəqiqələr; **~ cruelty** dəhşətli qəddarlıq; **~ ordeal** dəhşətli sınaq; 6. hirsli, acıqlı, qəzəbli, kinli; **~ look** hirsli/qəzəbli /kinli baxış; **to look ~ at/upon *smb.*** bir kəsə kinli /qəzəbli /acıqlı baxmaq;

◊ **~ frost** qırovsuz şaxta; **~ market** qara bazar; **~ cap** hakimlərin ölüm hökmü oxuyarkən geydiyi papaq; qara papaq geymiş hakim; **Black Death** *tar.* qara ölüm *(XIV əsrdə Avropada taun xəstəliyi)*; **~ eye 1)** zərbədən qaralmış göz; 2) biabırçılıq; 3) *amer.* pis ad; **~ sheep** törtöküntü; dönük, yaramaz, bədzad, rəzil; **~ flag** dəniz quldurlarının bayrağı; **~ and blue** döyülüb qaraldılmış *(bədən haq.)*; **to beat ~ and blue** döyüb əzişdirmək; **~ as hell** cəhənnəm kimi zülmət; **~ as soot** his kimi qara

**black**[3] [blæk] *v* 1. qara rəngə boyamaq; **to ~ shoes** ayaqqabını qara kremlə silmək; 2. vakslamaq, vaks sürtmək *(ayaqqabıya)*; 3. vurub qaraltmaq; **to ~ *smb.'s* eye** bir kəsin gözünü vurub qaraltmaq

**black-and-white** ['blækənd'wait] *adj* 1.: **in ~** yazılı; *I need this agreement in black-and-white Mənə bu saziş yazılı lazımdır;* 2. ağ-qara; **~ television** ağ-qara televizor; 3. barışmaz, qəti; **~ judgement** qəti hökm

**blackberry** ['blækbəri] *n* 1. böyürtkən; 2. qara qarağat

**blackbird** ['blækbə:d] *n zool.* qaratoyuq

**blackboard** ['blækbɔ:d] *n* yazı lövhəsi, yazı taxtası

**black-browed** ['blæk'braud] *adj* 1. qaraqaş, qaraqaşlı; 2. qaşqabaqlı, üzügülməz, qəmgin

**blackcock** ['blækkɔk] *n zool.* tetra quşu



**black currant** ['blæk 'kʌrənt] *n bot.* qara qarağat

**black earth** ['blæk'ə:θ] *n* qaratorpaq

**blacken** ['blækən] *v* 1. qaraltmaq, qara etmək; vakslamaq; 2. ləkələmək, şər/böhtan atmaq; *False accusations blackened her good name Saxta ittihamlar onun yaxşı adını ləkələdi;* 3. qaralmaq, yanmaq *(günəşdən)*

**blackening** ['blækəniŋ] *n* = **blacking**

**black-eyed** ['blækaid] *adj* qaragöz, qaragözlü

**black-face** [blækfeis] *n* 1. qaraağız heyvan; 2. *amer.* 1) zənci-müğənni; 2) zənci rolunda oynayan / çıxış edən aktyor; **to appear in ~** zənci rolunda çıxış etmək / oynamaq; 3. *poliqr.* qara şrift

**black gold** ['blæk'gould] *n* qara qızıl, neft

**blackguard**[1] ['blæga:d] *n* 1. alçaq, əclaf, namərd, yaramaz; *You, blackguard! Yaramazın biri!* 2. *arx.* küçə uşağı; 3. burunotu növü

**blackguard**[2] ['blæga:d] *v* 1. söyüş söymək, söyüşmək, söymək, yamanlamaq; 2. alçaqcasına/namərdcəsinə hərəkət etmək

**blackguardly**[1] ['blæga:dli] *adj* alçaq, əclaf, rəzil

**blackguardly**[2] ['blæga:dli] *adv* alçaqcasına, əclafcasına, namərdcəsinə

**black-head** ['blækhed] *n* civzə, sızanaq *(üzdə)*

**black-hearted** ['blæk'ha:tid] *adj* acıqlı, kinli, hirsli; zalım, qəlbiqara, mərdimazar

**black-henbane** ['blæk'henbein] *n bot.* bəngotu

**black-hole** ['blækhoul] *n* 1. zindan, həbsxana, məhbəs; 2. qauptvaxta *(hərbi qulluqçular üçün dustaqxana)*

**black ice** [ˌblæk'ais] *n* yolun səthindən fərqlənməyən nazik möhkəm sürüşkən buz; *Black ice made the road dangerous Yolu örtmüş möhkəm sürüşkən buz gəliş-gedişi təhlükəli etmişdi*

**blacking** ['blækiŋ] *n* vaksa, qutalin *(ayaqqabı mazı)*

**blacking-out** ['blækiŋ'aut] *n* pozma, qaralama, pozulma, qaralanma *(tekst haq.)*

**black-jack**[1] ['blæk'dʒæk] *n* 1. pivə üçün bardaq; 2. dəniz quldurlarının bayrağı; 3. *amer.* dəyənək

**black-jack**[2] ['blæk'dʒæk] *v amer.* dəyənəkləmək, dəyənəklə döymək

**black-kite** ['blæk'kait] *n zool.* çalağan

**blackleg**[1] ['blæk'leg] *n* 1. ştreykbrexer, *(tətili pozan adam)*, xain, satqın; 2. hiyləbaz, haramzada, hiyləgər, fırıldaqçı, cüvəllağı

**blackleg**[2] ['blækleg] *v* ştreykbrexer olmaq

**blacklist**[1] ['blæklist] *n* 1. qara siyahı; **to be on the ~** qara siyahıda olmaq; 2. borcunu verə bilməyən adamların /ölkələrin və s. siyahısı; **to be on the ~ for non-payment of debts** borcunu verə bilmədiyinə görə qara siyahıda olmaq/siyahıya düşmək

**blacklist**[2] ['blæklist] *v* qara siyahıya salmaq

**blackly** ['blækli] *adv* 1. hirsli, acıqlı; 2. qəmgin-qəmgin, kədərlə, qüssəli, kədərli, qəmli

**black magic** [ˌblæk'mædʒik] *n* sehrbazlıq, cadugərlik, ovsunculuq; cadu, ovsun

**blackmail**[1] ['blækmeil] *n* 1. şantaj *(hədə-qorxu)*; 2. zorakılıq; zorla alma, qoparma *(pul və s.)*

**blackmail**[2] ['blækmeil] *v* hədə-qorxu gəlmək, şantaj etmək/işlətmək, şantaj yolu ilə bir şeyi əldə etməyə çalışmaq *(pulu və s.)*

**blackmailer** ['blækˌmeiləʳ] *n* şantajçı, şantajla məşğul olan adam

**black market** [ˌblæk 'ma:kit] *n* qara bazar

**black marketeer** [ˌblæk'ma:kitiəʳ] *n* qara bazarda mal satan / alver edən adam

**black mulberry** ['blækˌmʌlbəri] *n bot.* qara tut

**blackness** ['blæknis] *n* 1. qaralıq; çirklilik, kirlilik; 2. qaranlıq; 3. tutqunluq, qaşqabaqlılıq

**black oil** ['blæk'ɔil] *n* mazut

**blackout**[1] ['blæk'aut] *n* 1. *teatr.* səhnədə işığın söndürülməsi; 2. işıqları söndürmə / keçirmə, işıqları maskalama *(müharibə vaxtı)*; 3. müvəqqəti olaraq elektrik işığının olmaması *(qəza nəticəsində)*; 4. qısa müddətə huşunu itirmə; 5. mətndən çıxarılma; 6. dayandırma, çıxmağa qoymama *(qəzet və s. haq.)*

**blackout**[2] ['blæk'aut] *v* 1. işıqları söndürmək, qaranlıq etmək; 2. huşunu itirmək; *After the accident she blacked out and couldn't remember what had happened Qəzadan sonra o, huşunu itirdi və nə baş verdiyini xatırlaya / yadına sala bilmədi;* 3. söndürmək *(işıqları)*

**black poplar** ['blæk'pɔplə] *n bot.* qaraqovaq *(ağac)*

**blackshirt** ['blækʃə:t] *n* qaraköynəklilər, faşistlər

**blacksmith** ['blæk'smiθ] *n* dəmirçi

**black swan** ['blækswɔn] *n zool.* qara qu quşu

**black-thorn** ['blækθɔ:n] *n bot.* çaqqal gavalısı, göyəm

**blacky**[1] ['blæki] *n d.d.* zənci, qaradərili

**blacky**[2] ['blæki] *adj* qaramtıl, qaratəhər, qarayaçalan

**bladder** ['blædəʳ] *n* 1. qabar, suluq, qabarıq; 2. *anat.* sidik kisəsi / kisəciyi; **~ stone** sidik kisəsinin daşı; 3. kamera *(hava ilə doldurulmuş rezin kisə)*; **football ~** futbol topunun kamerası; 4. gəvəzə, boşboğaz, hərzə, çərənçi, naqqal

**blade**[1] [bleid] *n* 1. tiyə; dil, ağız; 2. ot gövdəsi/saplağı, gövdəcik; uzun nazik yarpaq; **in the ~** yetişməmiş; 3. ağız; **the ~ of the oar** avarın ağzı; 4. qanad *(ventilyatorda)*

**blade**[2] [bleid] *adj fon.* dilönü; **~ consonants** dilönü samitlər

**blade**[3] [bleid] *v* 1. tiyəni soxmaq/sancmaq; 2. zoğ atmaq; 3. çirk təmizləmək, çınqılı buldozerlə təmizləmək

**blade-bone** ['bleidboun] *n anat.* kürək

**blake** [bleik] *adj* solğun, rəngiqaçmış, xəstətəhər

**blame**[1] [bleim] *n* 1. günah, suç, təqsir; məsuliyyət; *The blame is partly mine Günah / Təqsir qismənməndədir; The blame lies with me Günah / Suç mənimdir; It is small blame to you Sən / Siz çox da günahkar deyilsən / deyilsiniz;* **to bear the ~** məsuliyyət daşımaq; günahı/təq-

siri öz üzərinə götürmək; **to lay / to cast / to put the ~ for** *smth.* **upon** *smb.* günahı/suçu/təqsiri bir şeyə görə bir kəsin boynuna qoymaq; **to take the ~ upon oneself** günahı /suçu/taqsırı öz üzərinə götürmək; **to shun the ~** məsuliyyətdən boyun qaçırmaq; **to shift the ~ on** *smb.* günahı kiminsə boynuna qoymaq; 2. məzəmmət, töhmət, danlaq, tənə, qınaq; **to deserve ~** töhmətə/tənəyə layiq olmaq; *His conduct is free from blame Onun hərəkətləri nöqsansızdır / qüsursuzdur*

**blame²** [bleɪm] *v* günahlandırmaq, günahkar/suçlu bilmək, təqsirləndirmək, təqsirkar bilmək; məzəmmətləmək, qınamaq, məzəmmət etmək; *Who is to blame? Kimdir günahkar/təqsirkar?; I am in no way to blame Mən əsla günahkar deyiləm;* **to be much to ~** çox günahkar olmaq; *He is entirely to blame O tamamilə günahkardır;* **to ~** *smb.* **for** *smth.* bir kəsi bir şeyə görə günahlandırmaq/günahkar bilmək; *He cannot be blamed for it Onu buna görə günahkar hesab etmək olmaz; I have nothing to blame myself for Mən özümü heç nədə günahkar hesab etmirəm;*

◊ *A bad workman often blames his tools Pis işçi tez-tez öz alətlərini günahkar hesab edir*

**blameful** ['bleɪmfl] *adj* 1. qınağa/məzəmmətə layiq; 2. digərlərini qınamağa /məzəmmət etməyə meylli olan

**blameless** [bleɪmlɪs] *adj* eyibsiz, qüsursuz, ləkəsiz, nöqsansız; **a ~ life** qüsursuz/ləkəsiz/nöqsansız həyat; *He is blameless in this affair Onun bu işdə heç bir nöqsanı / suçu yoxdur*

**blamelessly** ['bleɪmlɪslɪ] *adv* nöqsansız, eyibsiz, qüsursuz *(olaraq)*

**blamelessness** ['bleɪmlɪsnɪs] *n* nöqsansızlıq, eyibsizlik, qüsursuzluq; günahsızlıq

**blameworthy** ['bleɪm.wə:ðɪ] *adj* 1. qınağa /məzəmmətə layiq; 2. cəzalanmalı, cəzaya layiq

**blanch** [bla:ntʃ, blæntʃ] *v* 1. ağartmaq, ağ rəngə boyamaq; *Age had blanched his hair İllər onun saçını ağartdı;* 2. rəngini qaçırmaq; *Fear blanched her lips Qorxu onun dodaqlarının rəngini qaçırtdı; Her face blanched with fear Qorxudan onun sifətinin rəngi qaçdı;* 3. qalaylamaq; 4. pörtlədib qabığını soymaq, qaynar su töküb qabığını soymaq; **to ~ almond** qaynar suya salaraq badamın qabığını təmizləmək

**blancmange** [blə'mɔnʒ] *n fr.* blanmanje *(qaymaq, qənd və jelatindən bişirilən şirin yemək)*

**bland** [blænd] *adj* 1. ədəbli, nəzakətli, mərifətli, mehriban, nəvazişli; **a voice sweetly ~** şirin mehriban bir səs; 2. yaltaq, hiyləgər, qılığagirən; **~ smile** yaltaq təbəssüm; 3. yumşaq *(iqlim və s. haq)*; **~ air** ılıq/yumşaq hava; 4. yüngül, sakitləşdirici; **~ diet** yüngül pəhriz; **~ medicine** sakitləşdirici dərman

**blandish** ['blændɪʃ] *v* 1. nəvaziş göstərmək, dilə tutmaq; 2. başdan çıxarmaq, tovlamaq, qılığına girmək

**blandishment** ['blændɪʃmənt] *n* 1. nəvaziş göstərmə, ələ alma, dilə tutma; 2. yaltaqlıq, yaltaqlanma, yaltaqlıqla tərifləmə

**blandly** ['blændlɪ] *adv* 1. ədəblə, nəzakətlə, mehribanlıqla, nəvazişlə; 2. yaltaq-yaltaq, hiyləgərliklə, hiyləgərcəsinə, nəvazişlə, mərifətlə

**blandness** ['blændnɪs] *n* 1. ədəblilik, nəzakətlilik, mehribanlıq, mərifətlilik

**blank¹** [blæŋk] *n* 1. boş / yazılmamış yer; *Leave a blank for his signature Onun imzası üçün yer qoy/qoyun;* 2. blank *(əl ilə doldurmaq üçün boş yerləri olan vərəqə)*; 3. tire *(buraxılmış sözün yerləri olan vərəqə)*; cızma, xətt səkmə; boş yer, buraxılmış yer; 4. boşluq, çatışmazlıq; nöqsan; *He must fill in the blanks in his education O, təhsilindəki çatışmazlığı aradan qaldırmalıdır;* 5. huşunu itirmə; *My mind is a complete blank Mən heç nə xatırlamıram, Mən hər şeyi unutmuşam;* 6. boşluq, düşgünlük; *Her son's death made a great blank in her life Oğlunun ölümü onun həyatında böyük bir boşluq yaratdı;* 7. uduşsuz lotereya bileti; **to draw a ~ 1)** uduşu olmayan lotereya bileti çəkmək; 2) müvəffəqiyyətsizliyə uğramaq

**blank²** [blæŋk] *adj (-er, -est)* 1. təmiz, yazılmamış *(kağız haq.)*; **~ paper/sheet/ space** təmiz kağız/səhifə/yer; 2. doldurulmamış *(sənəd haq.)*; **~ bulletin** doldurulmamış seçki bülleteni; **~ map** lal xəritə; 3. tikilməmiş *(yer, məkan haq.)*; *There are still many blank spaces in this suburb Bu şəhərkənarı ərazidə hələ də tikilməmiş çoxlu sahə var;* 4. ifadəsiz, mənasız, məzmunsuz; **~ face** ifadəsiz üz/sifət; **~ look** ifadəsiz/mənasız baxış; **~ years** barsız/məhsulsuz illər; 5. çaşdırılmış, karıxdırılmış, çətinliyə salınmış; **to look ~** çətinliyə düşmüş kimi görünmək, narahat görünmək; 6. tam, tamam, tamamilə; **~ silence** tam sakitlik; **to decline ~** tamamilə rədd etmək; **to deny** *smth.* **~** bir şeyi tamamilə inkar etmək

**blanket¹** ['blæŋkɪt] *n* 1. yun yorğan; 2. çul; 3. örtük, örtü; **a ~ of snow** qar örtüyü; **~ of smoke** tüstü örtüyü; *The hills lay under a blanket of snow Təpələr qar örtüyü altında idi;*

◊ **a wet ~ 1)** başqalarını ruhdan salan; 2) ruhdan salan şey; **to put/to play a wet ~ on** *smb.* bir kəsin həvəsini öldürmək; **born on the wrong side of the ~** kəbinsiz doğulmuş, bic doğulmuş

**blanket²** ['blæŋkɪt] *adj* 1. ümumi, tam, şərtsiz; **~ price** ümumi qiymət *(alınmış malların ümumi qiyməti)*; **~ rules** ümumi qaydalar; 2. *id.*: **~ finish** eynivaxtlı finiş

**blanket³** ['blæŋkɪt] *v* 1. örtmək *(həm də yorğanla)*; *The country was blanketed with snow Kənd qarla örtülmüşdü;* 2. bürümək, əhatə etmək, ehtiva etmək; 3. ört-basdır etmək, üstünü örtmək; *(məsələnin və s.)*; **to ~ a question** məsələni ört-basdır etmək; *The scandal was blanketed Qalmaqal ört-basdır edildi*



**blanketed** ['blæŋkɪtɪd] *adj* 1. yorğana bürünmüş; 2. bürünmüş, bələnmiş; **a hill ~ in fog** dumana bürünmüş təpə

**blanketing¹** ['blæŋkɪtɪŋ]*n* yorğanlıq *(parça)*

**blanketing²** ['blæŋkɪtɪŋ] *adj* qatı, sıx; **~ smoke** *hərb.* qatı tüstü pərdəsi; **~ fire** *hərb.* sıx /intensiv atəş

**blankly** ['blæŋklɪ] *adv* 1. laqeydcəsinə, laqeyd olaraq; key kimi, ifadəsiz; **to stare ~ at** *smb.* bir kəsə laqeydcəsinə baxmaq; 2. qəti, açıq, açıqdan-açığa, üzünə; **to deny** *smth.* **~** bir şeyi qəti olaraq inkar etmək; 3. əsl, qatı; *He is blankly atheistic O, qatı ateistdir*

**blare¹** [bleəʳ] *n* 1. truba səsi *(musiqi)*, gurultu, uğultu; **the ~ of the radio** radionun uğultusu; **the ~ of the horns** şeypurların səsi; **the ~ of the brass band** nəfəsli orkestrin gurultusu; 2. bağırtı, böyürtü; uğultu, gurultu; kəskin xoşagəlməz səs *(radio və s.)*; 3. avtomobilin fiti / fit səsi; 4. parlaq rəng, gözqamaşdırıcı parlaqlıq; **the ~ of colour in the picture** şəkildə gözqamaşdırıcı rəng

**blare²** [bleəʳ] *v* 1. şeypur/truba çalmaq; *The band blared (out) a march Nəfəsli orkestr marş çaldı;* 2. gurultu salmaq; *The radio is blaring; turn it off Radio gurultu salır; onu söndür/söndürün;* 3. avtomobil fiti vermək; **to ~ (out) a warning** avtomobil fiti ilə xəbərdarlıq etmək; 4. gözqamaşdırıcı işıq saçmaq, gözü qamaşdırmaq

**blarney¹** ['bla:nɪ] *n* şirin danışıq / dil; yaltaqlıq; *Don't be taken in by her blarney Onun şirin dilinə aldanma / aldanmayın*

**blarney²** ['bla:nɪ] *v* aldatmaq, tovlamaq *(yaltaqlıqla)*, yaltaqlanmaq, yaltaqlıq etmək, üzə gülmək

**blaspheme** [blæs'fi:m] *v* söymək, abrını tökmək, söyüb biabır etmək, yamanlamaq; küfr danışmaq, kafirlik etmək

**blasphemer** [blæs'fi:məʳ] *n din.* küfr edən / danışan adam, kafir

**blasphemy** ['blæsfɪmɪ] *n din.* küfr, küfrlük, kafirlik; *Their conversation was full of blasphemies Onların söhbəti küfrlə dolu idi*

**blast¹** [bla:st] *n* 1. ani şiddət, həmlə, küləyin ani və şiddətli əsməsi; **a ~ of wind** küləyin ani şiddəti; 2. hava axını, axın; **a ~ of steam** buxar axını; 3. nəfəsli alətin xoşagəlməz səsi; **to blow a ~ on the horn** şeypur çalmaq; 4. fit, sirena; **to sound ~** *dən.* fit vermək; 5. partlayış, partlama; partlayış zamanı əmələ gələn hava dalğası; **to set off a ~** partlayış etmək; *During the bombing many people were killed by (the) blast Bombardman zamanı çox adam partlayışdan əmələ gələn hava dalğasından öldü;*

◊ **to go full ~** tam/var gücü ilə işləmək; *He was working (at) full blast in order to complete the order before the holiday O, var gücü ilə işləyirdi ki, sifarişi bayrama qədər tamamlasın*

**blast²** [bla:st] *v* 1. partlatmaq *(qayanı və s.)*; 2. vurmaq *(şaxta)*; *Frost blasted the plants Şaxta bitkiləri vurdu;* 3. puç etmək, alt-üst etmək *(ümidi və s.)*; *Her death blasted all hopes Onun ölümü bütün ümidləri alt-üst etdi; Time has blasted his ambitions Zaman onun arzularını puç etdi / alt-üst etdi;* 4. söymək, lənətləmək; *Blast you! Səni / Sizi lənətə gələsən / gələsiniz!*

**blasted** ['bla:stɪd] *adj* 1. ildırım vurmuş; **an old ~ apple-tree** ildırım vurmuş qoca alma ağacı; 2. puça çıxmış, alt-üst olmuş; **~ hopes** alt-üst olmuş/puça çıxmış ümidlər; 3. lənətə gəlmiş; **~ dog** lənətə gəlmiş it; *Make that blasted dog keep quiet! Bu lənətə gəlmiş iti sakitləşdir!/sakitləşdirin!*

**blast-engine** ['bla:st'endʒɪn] *n* havaverən/havaüfürən maşın

**blast-off** ['bla:stɔf] *n* 1. uçma; qalxma; start *(kosmik gəmi haq.)*; 2. raketin buraxılış qurğusundan ayrıldığı an

**blatant** ['bleɪtənt] *adj* 1. qışqırıqçı, çığıran; çığırtı-bağırtı salan; kobud, qaba, ədəbsiz; 2. gurultulu, səs-küylü; 3. eşidilməmiş, görülməmiş; **~ injustice** görünməmiş ədalətsizlik; 4. açıq, aşkar, açıq-aydın; **~ lie** açıq-aşkar / ağ yalan

**blatantly** ['bleɪtəntlɪ] *adv* açıq, açıq-açığına, açıqca, açıq bir tərzdə

**blaze¹** [bleɪz] *n* I 1. alov, parlaq işıq / atəş; **in a ~** alovda, alov içində; **to set** *smth.* **in a ~** bir şeyi yandırmaq; *The fire burst / sprang into a blaze Ocaq alovlandı;* 2. partlayış, partlama *(hirsdən, ehtirasdan və s.)*; **in a ~ of anger** qəzəbin şiddətli zamanı; 3. dəhşətli yanğın; **to put the ~ out** yanğını söndürmək; 4. parlaq işıq / rəng, gözqamaşdırıcı işıq; **a ~ of search-lights** projektorların parlaq / gözqamaşdırıcı işığı; **in the ~ of the day** günün günorta çağı; 5. parlaqlıq; gözəllik, qəşənglik; cah-calal; **the full ~ of beauty** gözəlliyin cah-cəlalı

**blaze** [bleɪz] *n* II 1. qaşqa *(heyvan, xüs. at haq.)*; 2. nişan *(ağacda)*

**blaze²** [bleɪz] *v* I 1. alovla yanmaq, alovlanmaq; *A wood fire was blazing (away) in the hearth, but there was no other light in the room Odunla qalanmış ocaq alovla yanırdı, lakin otaqda ondan başqa işıq yox idi;* 2. *məc.* od tutub yanmaq, parlamaq, şəfəq vermək/saçmaq; işıq saçmaq, yanmaq; *Her eyes were blazing with anger Onun gözləri acıqdan/hirsdən alışıb yanırdı; Lights were blazing in every room Hər bir otaqda işıq yanırdı;* 3. aləmə yaymaq, hamıya bildirmək/car çəkmək *(şayiəni və s.)*; **to ~ a rumour (abroad)** şayiə yaymaq;

◊ **to ~ away 1)** atəş açmaq; 2) *d.d.* cəld /tez-

tez danışmaq, üdüləmək, üdüləyib tökmək; **to ~ out** *(at)* hirslənmək, acığı tutmaq, acıqlanmaq *(bir kəsə)*; **to ~ up 1)** qızışmaq, şiddətlənmək; *The old conflict blazed up again Köhnə münaqişə yenidən qızışdı/alovlandı;* 2) hirslənmək, acıqlanmaq, acığı tutmaq

**blaze** [bleɪz] *v* II 1. nişan qoymaq, nişanlamaq *(ağacda)*; **to ~ the tail** ağaclarda kərtik qoymaqla meşədə yolu nişanlamaq; 2. *məc.* yol açmaq; **to ~ a trail into space** kainata yol açmaq

**blazer** ['bleɪzəʳ] *n* 1. flaneldən *(seyrək xovlu və ya xovsuz iplik və ya yun parça)* tikilmiş idman kurtkası/gödəkçəsi; 2. *d.d.* ağ yalan; 3. *amer. d.d.* qeyri-təvazökarlıq, nəzakətsizlik, həyasızlıq, utanmazlıq

**blazing** ['bleɪzɪŋ] *adj* 1. alovla yanan, qızğın, alovlanan; alovlu; **a ~ quarrel** alovlu /qızğın mübahisə; **a ~ building** alovla yanan / alov bürümüş bina; *People were led out of the blazing building Adamları alovlanan binadan çıxartdılar;* 2. açıq-aydın, təzə; **~ scent** *ovç.* təzə iz; 3. məlum; görünməmiş, eşidilməmiş; **~ lie** ağ yalan; *His story was just one blazing lie from start to finish Onun hekayəti əvvəldən axıra kimi / qədər sadəcə olaraq ağ yalan idi*

**blazon**[1] ['bleɪzn] *n* 1. gerb; emblem, nişan, rəmz; 2. tərif, mədh, tərif / mədh etmə; təntənə ilə elan etmə / edilmə

**blazon**[2] ['bleɪzn] *v* 1. bildirmək, xəbərdar etmək, xəbər vermək; aləmə yaymaq, hamıya bildirmək / xəbər vermək; açmaq *(sirri)*; nümayiş etdirmək; 2. gerbi təsvir etmək; 3. gerblə bəzəmək

**blazoner** ['bleɪznəʳ] *n* carçı

**blazonery** ['bleɪznrɪ] *n* 1. heraldika *(gerblər və onların tarixinin təsviri)*; 2. parlaq nümayiş, mahiranə / məharətlə nümayiş etdirmə

**bleach**[1] [bli:tʃ] *n* 1. xlorlu ağ boyaq məhlulu; ağardıcı maddə; *My shirt was so dirty that I had to use bleach on it Mənim köynəyim elə çirkli idi ki, ağardıcı maddədən istifadə etməli oldum;* 2. ağartma, ağardılma

**bleach**[2] [bli:tʃ] *v* 1. ağartmaq; ağ rəng çəkmək; 2. solğunlaşdırmaq, soldurmaq, rəngini zəiflətmək

**bleachers** ['bli:tʃəz] *n amer.* tamaşaçılar üçün ucuz yerlər *(stadionda və s.)*

**bleaching** ['bli:tʃɪŋ] *n* ağartma, ağardılma

**bleaching powder** ['bli:tʃɪŋ.paudəʳ] *n* xlorlu məhlul/əhəng

**bleak** [bli:k] *adj* 1. açıq, müdafiəsiz, müdafiə olunmayan; 2. soyuq, sərt, şiddətli *(iqlim, hava haq.)*; **~ wind** soyuq külək; *The weather in early December was bleak Dekabrın əvvəllərində hava sərt idi;* 3. bitkisi olmayan, yalın, quru *(yer haq.)*; 4. qəmgin, məyus, kədərli, həzin; **~ smile** qəmgin / kədərli təbəssüm; 5. rəngsiz, solğun, rəngiqaçmış

**bleakness** ['bli:knɪs] *n* küləkdən və s. müdafiə edilməmə

**blear**[1] [blɪəʳ] *adj* 1. dumanlı, dumanlandırılmış *(göz yaşından)*; 2. *məc.* aydın olmayan, aşkar olmayan, qeyri-müəyyən, anlaşılmaz

**blear**[2] [blɪəʳ] *v* 1. tutqunlaşdırmaq, dumanlandırmaq *(baxışı, cilalanmış səthi)*; **to ~ the eyes 1)** baxışı dumanlandırmaq; 2) aldatmaq, yolundan çıxartmaq; **~ing eyes** yaşarmış / yaşla dolu gözlər; 2. dumanlı etmək, dumanlandırmaq

**blear-eyed** ['blɪəraɪd] *adj* 1. gözü torlanmış; 2. *məc.* uzaqgörməyən; korazehin, qanmaz, fəhmsiz

**blear-eyedness** ['blɪər.aɪdnɪs] *n* göz yaşı axması, gözlərin sulanması

**bleat**[1] [bli:t] *n* mələmə; movuldama, böyürmə

**bleat**[2] [bli:t] *v* 1. mələmək; movuldamaq, böyürmək; 2. nazik səslə danışmaq; **to ~ out a protest** zəif səslə etiraz etmək; 3. axmaqlamaq, giciləmək, axmaq-axmaq / gic-gic danışmaq; çərənləmək, naqqallıq / boşboğazlıq etmək

**bleed** [bli:d] *v (pt, pp* **bled** [bled]*)* 1. qan axmaq, qanamaq, qan gəlmək; qan aparmaq, çox qan itirmək; **to ~ to death** qan itirməkdən ölmək; *He is bleeding at the nose Onun burnundan qan axır / qan gəlir, Onun burnu qanayır;* 2. *məc.* qan ağlamaq; *My heart bleeds Mənim ürəyim qan ağlayır;* 3. qan tökmək *(döyüşdə)*; 4. qan almaq; 5. zorla almaq, qoparmaq *(pul və s.)*; *They bled him for a cool thousand Onlar ondan düz min manat pul qopartdılar;*
◊ **to ~ white** 1) gücdən/əldən salmaq; 2) var-yoxunu almaq, talan etmək

**bleeder** ['bli:dəʳ] *n* 1. hemofil *(burnu tez-tez qanayan adam)*; 2. hədə ilə / hədə-qorxu ilə alma, fırıldaqla başqasından pul alan/qopardan adam, qoparma *(pul və s.)*

**bleeding**[1] ['bli:dɪŋ] *n* 1. qanaxma, qanama; **~ at the nose** burundan qanaxma; 2. qanalma

**bleeding**[2] ['bli:dɪŋ] *adj* 1. ürəyindən qara qanlar axan; 2. gücdən / əldən salınmış, zəiflədilmiş, zəif salınmış; **~ country** zəiflədilmiş ölkə *(müharibə nəticəsində)*; 3. ürəyi yanma, yazığı gəlmə, acıma

**bleep**[1] [bli:p] *n diqqəti cəlb etmək üçün hər hansı bir cihazın çıxardığı səs, yer peykinin göndərdiyi səs*

**bleep**[2] [bli:p] *v* cihaz vasitəsilə səs göndərmək; *The machine bleeps Cihaz səs göndərir*

**blemish**[1] ['blemɪʃ] *n* 1. nöqsan, qüsur, eyib; **without ~** eyibsiz, qüsursuz, kamil; **to find a ~ in** *smth.* nədəsə qüsur / eyib / nöqsan tapmaq; *The only blemish on the baby's skin was a red mark on its neck Uşağın dərisində yeganə qüsur onun boynunda olan qırmızı xal/ləkə idi;* 2. biabırçılıq, rüsvayçılıq; ləkə; **a name without ~** ləkəsiz / ləkələnməmiş ad

**blemish**[2] ['blemɪʃ] *v* 1. xarab etmək, korlamaq; *Her beautiful face was blemished by the marks of an old wound Köhnə yaranın nişanələri onun gözəl sifətini korlamışdı;* 2. ləkələmək, biabır



etmək; *Her name had been blemished by a newspaper article Onun adı qəzetdə verilmiş məqalə ilə ləkələndirilmişdi*

**blench** [blentʃ] *v* 1. boyun qaçırmaq, yayınmaq; geri çəkilmək, əl çəkmək, uzaqlaşmaq; **to ~ the facts** faktlara/ dəlillərə əhəmiyyət verməmək; 2. səksənmək, diksinmək, çimçişmək, tükləri ürpəşmək; *He blenched as the bright light suddenly shone on him Parlaq işıq onun üstünə düşdükdə o diksindi; When he got the injection he didn't blench İynə vurulanda o, tükünü də tərpətmədi*

**blend**[1] [blend] *n* 1. qarışıq, qatışıq; *This coffee is a blend of two sorts Bu kofe iki növün qarışığıdır;* 2. qarışdırma, qatışdırma; 3. bir rəng çalarından digərinə keçmə; 4. *dilç.* hibrid söz; *Motel is composed of motor and hotel and is called a blend word Motel motor və hotel sözlərindən əmələ gəlmişdir; buna görə ona hibrid söz deyirlər*

**blend**[2] [blend] *adj* qarışdırılmış, qatışdırılmış, qatılmış; **~ tea/coffee/wine** qatışdırılmış çay / kofe / şərab

**blend**[3] [blend] *v* 1. qarışdırmaq, qatışdırmaq; **to ~ paints** rəngləri /boyaları qatışdırmaq; **to ~ tea/coffee/ wine** çay/kofe/şərab növlərini qatışdırmaq; *Blend the sugar, flour and eggs together Qəndi, unu və yumurtaları bir yerdə qarışdır/qarışdırın;* 2. qarışmaq; *Oil and water do not blend Yağ və su qarışmır;* 3. birləşdirmək; **to ~ parties** partiyaları birləşdirmək; 4. birləşmək, bir yerə qovuşmaq; 5. rəngləri seçmək / uyğunlaşdırmaq, uyğun gəlmək; həmahəng olmaq; *The two colours blend well Bu iki rəng yaxşı uyğunlaşır; The new curtains blend well with the rug Təzə pərdələr xalça ilə əla uyğunlaşır / uyğun gəlir*

**blended** ['blendɪd] *adj* qatışdırılmış, qatılmış, qarışdırılmış; **~ fuel** qatışdırılmış yanacaq; **~ product** qatılmış/qatışdırılmış məhsul

**blender** ['blendəʳ] *n* 1. *d.d.* ünsiyyətli/mehriban adam; 2. *tex.* ağac, maşın *(bir şeyi qarışdırmaq üçün)*

**blent** [blent] **to blend** *felinin pt, pp formaları*

**bless** [bles] *v (pt, pp* **blessed** [blest]*)* 1. xeyir-dua vermək / etmək, uğurlamaq; *The priest blessed the ship before it left the port Limanı tərk etməzdən əvvəl keşiş gəmiyə xeyir-dua verdi;* 2. təşəkkür etmək; razılıq / minnətdarlıq etmək; **to ~ *one's* stars** taleyindən razılıq etmək; 3. müqəddəs saymaq, əziz tutmaq, təqdis etmək; *The priest blessed the bread and wine in preparation for the ceremony Mərasimi hazırlamaq üçün keşiş çörəyi və şərabı təqdis etdi;* 4. həddindən artıq tərifləmək/mədh etmək; 5. əta/ bəxş etmək; *He was blessed with good health Allah ona yaxşı sağlamlıq əta/bəxş etmişdi;* 6. özünü xoşbəxt hesab etmək/saymaq;
◊ *Bless me/ my soul! Ay allah! Xudaya xudavənda! Allah özün saxla / hifz et! Bless my heart and soul! Allaha and olsun! Allah eləməsin! Bless you! Sağlam ol /olun, Xeyir olsun! Ya haqqın allahı!*

**blessed** ['blesɪd] *adj* xoşbəxt, uğurlu, bəxtiyar; təqdis edilmiş, əziz tutulmuş, müqəddəs, əqdəs; bəxtli, məsud; **~ days** xoşbəxt günlər; *These were the blessed days O günlər xoşbəxt /bəxtiyar günlər idi;* **the ~ ones** *din.* müqəddəslər; *The blessed live on in heaven Müqəddəslər cənnətdə yaşayırlar*

**blessedness** ['blesɪdnɪs] *n* xoşbəxtlik, səadət, kef; tale, bəxt

**blessing** ['blesɪŋ] *n* 1. xeyir-dua vermə, xoşbəxtlik arzu etmə; xeyir-dua; 2. xoşbəxtlik, səadət, iltifat, kömək, mərhəmət; *The blessing of the Lord be upon you all Qoy Allah sizin hamınıza mərhəmət etsin;* 3. dua *(yeməkdən əvvəl və sonra edilən)*

**blest** [blest] **to bless** *felinin pt, pp formaları*

**blether**[1] ['bleðəʳ] *n d.d.* cəfəngiyyat, boşboğazlıq, boş danışıq, boş söhbət, uydurma, yalan

**blether**[2] ['bleðəʳ] *v d.d.* boşboğazlıq / naqqallıq etmək, çənə vurmaq, çərənləmək

**blew** [blu:] **to blow** *felinin pt forması*

**blight**[1] [blaɪt] *n* 1. *bitkilərdə ölgünləşmə, inkişafın dayanması və yarpaqların tökülməsi və quruması ilə müşayiət olunan xəstəlik*; 2. bitkilərdə olan parazit-həşərat; 3. kefi/nəşəni pozan şey; *This was a blight upon his youth Bu onun gəncliyini zəhərlədi; His illness was a blight to his hopes Xəstəliyi onun ümidlərini puç etdi;* 4. düşkünlük, tənəzzül; tələf /məhv / həlak / puç olma

**blight**[2] ['blaɪt] *v* 1. ziyan vermək *(bitkilərə)*; 2. puç/məhv etmək *(ümidi)*; *Our hopes are blighted Bizim ümidlərimiz puç oldu/puça çıxdı;* 3. zəhərləmək, korlamaq *(kefi, nəşəni və s.)*

**blighter** ['blaɪtəʳ] *n* 1. məhvedici, həlakedici; 2. *d.d.* yaramaz, heç bir əhəmiyyəti olmayan adam; pis / nifrətoyadan / iyrənc adam; *I told that blighter not to come here again. Mən o yaramaza dedim ki, bir də bura gəlməsin;* 3. oğlan, gənc, cavan; *You lucky blighter! Sən /Siz bəxtəvərsən /bəxtəvərsiniz! Poor blighter Yazıq, fağır, bədbəxt, biçarə, zavallı; Poor little blighter! Yazıq balaca zavallı!*

**blind**[1] [blaɪnd] *n* 1. pəncərə pərdəsi; markiza *(pəncərənin bayır tərəfindən asılan günlük)*; pəncərə qapağı, pəncərə taxtası; *Lower / Pull down the blinds Pəncərənin pərdəsini aşağı sal/salın; Raise / Draw up the blinds Pəncərənin pərdəsini yuxarı qaldır/qaldırın;* 2. *pl* gözlük *(1. gözü güclü işıqdan, tozdan qoruyan sarğı və ya sipərcik; 2) hürkək atların yana baxmasına mane olmaq üçün gözlərinin üstünə taxılan sipərcik)*; 3. bəhanə; maska, yalan; *That's only a blind Bu sadəcə olaraq maskadır / yalandır*

**blind**[2] [blaınd] *adj* 1. kor; görməyən, görə bilməyən; ~ **in/of an eye** bir gözdən kor; **to go/to become** ~ kor olmaq; 2. kor-koranə; ~ **obedience** kor-koranə itaət; 3. korlar üçün; ~ **asylum** korlar üçün sığınacaq; **a ~ school** korlar üçün məktəb; ~ **search** kor-koranə axtarış; **to go it ~** kor-koranə hərəkət etmək; 4. görünməyən, nəzərəçarpmayan, gizli; ~ **hemming / stitch** görünməyən / nəzərəçarpmayan tikiş; 5. aydın/aşkar/bəlli olmayan, örtülü; anlaşılmaz; ~ **letter** ünvansız / ünvanı oxunmayan məktub; 6. çıxışı olmayan; ~ **path** dalan; 7. donuq, tutqun *(boya haq.)*; *d.d.* **to be ~ to one's interest** xeyrini bilməmək, xeyri gələn yerə papaq tıxamaq; **to be ~ to smb.'s faults /drawbacks** bir kəsin günahını/qüsurunu görməmək; **to be ~ to beauties of nature** təbiətin gözəlliklərinə biganə olmaq; **to be ~ to the obvious** heç nə görməmək; heç nəyə diqqət yetirməmək, hər şeyə biganə qalmaq / olmaq; 8. *d.d.* sərxoş, kefli, lül; **to drink oneself ~** yıxılana qədər içmək, lül-qəmbər olmaq;
◊ ~ **date** *amer.* tanış olmayan adamla görüş; **to apply/to turn the ~ eye to smth.** heç bir şeyə diqqət verməmək/ yetirməmək; **as ~ as a bat** yarasa kimi kor

**blind**[3] [blaınd] *v* 1. kor etmək; *The soldier was blinded in battle Əsgər döyüşdə / vuruşda kor oldu; I was blinded by the smoke from the burning leaves Yanan xəzəlin tüstüsü məni kor etdi;* 2. qaranlıqlaşdırmaq, qaranlıq etmək; *Shrubbery blinded all the windows Kol-kos bütün pəncərələri qaranlıqlaşdırmışdı;* 3. gizlətmək, ört-basdır etmək; aldatmaq; **to ~ the real state of affairs** işin əsl mahiyyətini gizlətmək / ört-basdır etmək

**blindage** ['blaındıdʒ] *n* 1. blindaj, istehkam *(səngərdə top güllələrindən qorunmaq üçün sipər)*; 2. travers *(səngərin yanlarına tökülən torpaq qalağı)*

**blind alley**[1] ['blaınd'ælı] *n* 1. dalan, tupik; 2. çıxılmaz vəziyyət; **to be trapped in a ~** çıxılmaz vəziyyətə düşmək; 3. perspektivsiz məşğuliyyət; *Your job is a blind alley Sənin / Sizin işin / işiniz perspektivsizdir*

**blind alley**[2] ['blaınd'ælı] *adj* 1. çarəsiz, çətin, çıxılmaz, əlacsız; 2. perspektivsiz, gələcəyi /perspektivi olmayan; ~ **job/occupation** perspektivi olmayan iş / məşğuliyyət

**blind-coal** ['blaındkoul] *n* alovsuz yanan kömür, antrasit *(daş kömürün əla növü)*

**blinded** ['blaındıd] *adj* 1. kor edilmiş, gözü çıxardılmış; gözləri qamaşmış; 2. pərdə tutulmuş / asılmış

**blinders** ['blaındəz] *n pl* gözlük *(atda)*

**blindfold**[1] ['blaındfould] *n* göz sarğı *(görməmək üçün)*

**blindfold**[2] ['blaındfould] *adj* 1. gözübağlı; 2. kor-koranə hərəkət edən; ağılsız, düşüncəsiz, tədbirsiz, ehtiyatsız

**blindfold**[3] ['blaındfould] *v* 1. gözünü bağlamaq; **to ~ smb.** bir kəsin gözünü bağlamaq; 2. *məc.* kor etmək, görməyə mane olmaq

**blindfold**[4] ['blaındfould] *adv* 1. gözübağlı; *I could do it blindfold Mən onu gözübağlı edərdim;* 2. kor-koranə, düşünmədən; **to act ~** kor-koranə/düşünmədən hərəkət etmək; **to do smth. ~** bir şeyi kor-koranə / düşünmədən etmək

**blind gut** ['blaındgʌt] *n anat.* kor bağırsaq

**blinding**[1] ['blaındıŋ] *n* gözləri qamaşdırma, gözləri qamaşma; ~ **by head-lights** avtomobil/gəmi fənəri vasitəsi ilə gözləri qamaşdırma

**blinding**[2] ['blaındıŋ] *adj* qamaşdıran, kor edən *(gözləri)*; **a ~ flash** gözqamaşdırıcı işıq / alov

**blindly** ['blaındlı] *adv* kor-koranə, ağılsız bir surətdə, bilmədən, düşünmədən; qeyri-şüuri, mexaniki; **to believe ~** kor-koranə inanmaq

**blind-man's-buff** [ˌblaındmænz'bʌf] *n* gözübağlıca *(uşaq oyunu)*

**blind man's holiday** [ˌblaındmænz'hɔlədı] *n* toran, qaşqaralan vaxt, alaqaranlıq

**blindness** ['blaındnıs] *n* 1. korluq; kor olma; 2. ağılsızlıq, düşüncəsizlik

**blink**[1] [blıŋk] *n* 1. parıldama, titrək işıq vermə, sayrışma; 2. qırpım, göz qırpımı, ləhzə, an; **like a ~** dərhal, o saat; *He must have died like a blink Yəqin ki, o dərhal ölüb*

**blink**[2] [blıŋk] *adj* 1. sayrışan; göz vuran; 2. turştəhər *(süd haq.)*

**blink**[3] [blıŋk] *v* 1. göz qırpmaq, kirpik çalmaq; 2. göz vurmaq/eləmək; *Don't blink your eyes Göz vurmayın/eləməyin;* 3. gözlərini qıymaq; *She blinked her eyes as the bright light shone on her Parlaq işıq onun üstünə düşdükdə o, gözlərini qıydı;* 4. parlamaq, parıldamaq; sayrışmaq, titrək işıq saçmaq/vermək; *The lights of a steamer blinked out at the sea Paroxodun işıqları dənizdə sayrışırdı;* 5. baxmaq, arabir baxmaq / göz yetirmək, göz gəzdirmək; 6. turşumaq *(süd haq.)*; 7. çəkinmək, qaçınmaq, kənar gəzmək; nəzərə almamaq, əhəmiyyət verməmək, məhəl qoymamaq, diqqət yetirməmək, etinasızlıq göstərmək; **to ~ the question** sualdan qaçınmaq; **to ~ the facts** faktlara məhəl qoymamaq; 8. göz yummaq; **to ~ at smth.** bir şeyə göz yummaq

**blinking**[1] ['blıŋkıŋ] *n* 1. göz qırpma, kirpik çalma; 2. göz vurma/eləmə; 3. göz yumma, diqqət yetirməmə; ~ **of a fact** fakta göz yumma / diqqət yetirməmə; *There is no blinking of a fact Fakta göz yummaq olmaz*

**blinking**[2] ['blıŋkıŋ] *adj* gözvuran; sayrışan, titrəyən *(işıq haq.)*

**bliss** [blıs] *n* xoşbəxtlik, bəxtəvərlik, səadət, məmnunluq

**blissful** ['blısfl] *adj* xoşbəxt, bəxtiyar, bəxtəvər, məmnun, fərəhli; *We spent a blissful day Biz xoşbəxt bir gün keçirdik*

**blissfully** ['blısfəlı] *adv* bəxtəvərcəsinə, bəxtiyarcasına, fərəhlə, məmnunluqla, məmnun / bəxtiyar bir tərzdə



**blissfulness** ['blısfəlnıs] *n* xoşbəxtlik, bəxtəvərlik, səadət

**blister**[1] ['blıstə$^r$] *n* 1. qabar, suluq; *His new shoes raised blisters on his feet Onun təzə ayaqqabısı ayağında suluq əmələ gətirdi;* 2. qabarcıq, şiş *(təkərdə və s.)*; *There were blisters on the painting Şəklin üstündə qabarcıqlar vardı;* 3. *kob.* gözəyən qadın, fahişə, qəhbə

**blister**[2] ['blıstə$^r$] *v* qabar/suluq etmək; qabarcıq əmələ gətirmək; *Her shoes blistered her feet Onun ayaqqabısı ayağını qabar etdi; The heat blistered the paint İsti boyada qabarcıq əmələ gətirdi*

**blistery** ['blıstərı] *adj* suluqlu, suluqla örtülmüş, qabarlı

**blithe** [blaıð] *adj şair.* bəxtəvər, xoşbəxt; qayğısız, dərdsiz, qəmsiz

**blithering** ['blıðərıŋ] *adj* gic-gic/boş-boş / avara-avara danışan

**blitz**[1] [blıts] *n* güclü bombalama, güclü təyyarə / hava hücumu; *During the blitz everyone used to spend the night in underground shelters Güclü hava hücumu zamanı hamı gecəni yeraltı sığınacaqda keçirdi*

**blitz**[2] [blıts] *v hərb.* bombalamaq; *The East End of London was badly blitzed in 1940 1940-cı ildə Londonun İst End hissəsi güclü surətdə bombalandı*

**blizzard** ['blızəd] *n* 1. boran, çovğun, qar tufanı; 2. *amer.* top/yaylım atəşi; 3. düz / sərrast atəş; **to take a ~ at smth.** bir şeyə sərrast atəş açmaq

**bloat** [blout] *v* I 1. şişmək, köpmək; kökəlmək; *He begins to bloat O kökəlməyə başlayır; His income is bloating Onun gəliri artır;* 2. doldurmaq *(hava ilə)*; üfürüb doldurmaq / köpürmək

**bloat** [blout] *v* II hisə vermək *(balığı)*

**bloated** ['bloutıd] *adj* I 1. yağlı, piyli, piylənmiş, şişman, çox kök, köpmüş; ~ **body/face** şişman bədən / üz; **the ~ body of a drowned animal** suda batmış heyvanın şişmiş cəsədi; 2. şişirdilmiş, həddən artıq; ~ **budget** şişirdilmiş büdcə; 3. lovğa, təkəbbürlü, dikbaş, iddialı

**bloated** ['bloutıd] *adj* II hisə verilmiş, hisdə qurudulmuş

**bloater** ['bloutə$^r$] *n* hisə verilmiş / hisdə qurudulmuş siyənək balığı

**blob**[1] [blɔb] *n* 1. damcı; gilə; rəng ləkəsi; **a ~ of ink / paint / wax** mürəkkəb / rəng / parafin ləkəsi; 2. kürəcik

**blob**[2] [blɔb] *v (-bb-)* ləkə salmaq; *My fountain-pen is blobbing Mənim avtomat qələmim ləkə salır*

**bloc** [blɔk] *n* blok, birləşmə; **opposing ~s** bir-birinə qarşı duran bloklar

**block**[1] [blɔk] *n* 1. kötük; qaya; iri daş / buz və s. parçası; **a ~ of ice** iri buz parçası; 2. *tar.* cəllad kötüyü; **to be sent to the ~** ölüm cəzasına məhkum edilmək; 3. yaşayış massivi; məhəllə; **to walk three ~s** üç məhəllə gəzmək / getmək; *He lives two blocks from us O bizdən iki məhəllə aralı yaşayır;* 4. maneə; əngəl, tıxanma; hərəkətin dayanması; **traffic ~** tıxanma, tıxac *(küçə hərəkətində)*; *There was a block in the pipe and the water could not flow Borunun içində tıxac vardı və su axmırdı;* 5. blok; parça; **a ~ of cigarettes** bir blok siqaret; **a ~ of soap** bir parça sabun; 6. *poliqr.* klişe *(çap üçün metal və ya taxta parçası üzərində tərsinə qazılmış şəkil, basmaqəlib)*; 7. qəlib, papaq qəlibi; 8. gic, axmaq, küt, korazehin, qanmaz *(söyüş)*;
◊ **to cut ~s with razor** boş yerə zəhmət çəkmək, boş işlə məşğul olmaq

**block**[2] [blɔk] *v* 1. kəsmək *(yolu)*, sədd çəkmək, əngəl törətmək / yaratmaq; blokadaya almaq, dövrəyə almaq, təcrid etmək; **to ~ the access** keçidi kəsmək; **to ~ the enemy's advance** düşmənin irəliləməsinə mane olmaq; *All the roads were blocked by the heavy snowfalls Güclü qar bütün yolları kəsmişdi;* 2. mane olmaq, çətinlik yaratmaq / törətmək; puça çıxartmaq; *The commander succeeded in blocking the enemy's plan Komandir düşmənin planını puça çıxartmağa müvəffəq oldu;* **to ~ an appointment** təyinata *(vəzifəyə)* mane olmaq; 3. qanun layihəsinin qəbul edilməsini ləngitmək *(parlamentdə və s.)*; 4. qəlibə vurmaq / salmaq; 5. dayaq vurmaq/vermək, dayaq vurub saxlamaq; himayə etmək, kömək etmək; 6. yolunu kəsmək, tutmaq; **to ~ up a hole** deşiyi tutmaq; *My nose is blocked Burnum tutulub;* 7. *kim.* aktivliyini itirmək

**blockade**[1] [blɔ'keıd] *n* 1. blokada, mühasirə, dövrəyə alma; **long-distance ~** uzaq məsafədən blokada; **notified/pacific/war ~** nota ilə bildirilmiş /dinc/hərbi blokada; **paper ~** təsirsiz blokada; **to break ~** blokadanı yarmaq; **to establish/to set up a ~** blokadaya almaq; **to raise the ~** blokadanı qaldırmaq/götürmək; **to run the ~** blokadanı yarmaq; 2. *amer.* hərəkətin tıxanması / dayanması

**blockade**[2] [blɔ'keıd] *v* 1. blokadaya almaq, mühasirə etmək, dövrəyə almaq; *The ships blockaded the harbour Gəmilər limanı blokadaya aldı;* 2. mane olmaq, maneçilik törətmək/ yaratmaq

**blockade-runner** [blɔ'keıd.rʌnə$^r$] *n* blokadanı yarmağa cəhd göstərən gəmi

**blockage** ['blɔkıdʒ] *n* 1. tıxac, tıxanma; bağlanma, tutulma; *There is a blockage in the pipe somewhere Truba haradasa tıxaclanıb / tutulub;* 2. maneə qurğusu; 3. *amer.* çınqıl, qırma daş

**blockhead** ['blɔkhed] *n* gic, axmaq, küt, korazehin, qanmaz

**blockish** ['blɔkıʃ] *adj* küt, korazehin, anlamaz, qanmaz, fəhmsiz, sarsaq, səfeh, ağılsız, başıboş

**block-letter** ['blɔk'letə$^r$] *n* çap hərfi; *Please write*

*your name in block-letters Zəhmət olmasa, adını/adınızı çap hərfləri ilə yaz/ yazın*

**bloke** [blouk] *n kin.* adam, cavan

**blond** [blɔnd] *n* sarışın, sarıyanız

**blonde**[1] [blɔnd] *n* sarışın, sarıyanız, sarısaç qadın / qız

**blonde**[2] [blɔnd] *adj* sarışın, açıq sarısaçlı

**blood**[1] [blʌd] *n* **1.** qan; **to shed / to spill** ~ qan tökmək; **to give** *one's* ~ **for** *one's* **country** özünü vətəninə qurban vermək; **to let** *one's* ~ *tib.* qan almaq; **to spit** ~ qan tüpürmək; *Blood rushed to his head Qan onun başına vurdu;* **to stain** *one's* **hands with** ~ əllərini qanla ləkələmək; **to dip** *one's* **hand in** ~ əlini qana batırmaq, öldürmək; **to have** *smb.'s* ~ **on** *one's* **head** bir kəsin ölümündə günahkar olmaq, bir kəsin ölümünə səbəb/bais olmaq; **a man of** ~ qəddar / amansız adam, qatil; **2.** nəsil; **base** ~ qeyri-qanuni doğulmuş, bic; **high** ~ ali nəsil; **the ties of** ~ qan əlaqəsi; *one's* **own flesh and** ~ qohum; *It runs in his blood Bu onun qanındadır;* **3.** temperament, xarakter; ehtiras; *Blood is up Ehtiraslar coşub;* **4.** su, şirə *(ağac, meyvə haq.)*

**blood**[2] [blʌd] *adj* **1.** qan; ~ **feud** qan düşməni; ~ **test/examination** qan analizi; ~ **serum** qan laxtalanması; ~ **pressure** *tib.* qan təzyiqi; ~ **bank** qan ehtiyatı; ~ **group/type** qan qrupu; ~ **heat** qana hərislik;

◊ **to be out for** ~ qana susamaq; **bad** ~ düşmənçilik; **to make bad** ~ **between** *smb.* bir kəs arasında düşmənçilik yaratmaq; **to make** *smb.'s* ~ **boil** bir kəsin qanını coşdurmaq, bir kəsi qəzəbləndirmək; **to have no** ~ **in** *one's* **veins** qorxaq / cəsarətsiz olmaq, qətiyyətsiz olmaq

**blood**[3] [blʌd] *v* **1.** qan almaq; **2.** qana qanıxdırmaq *(ov itini)*; **3.** *ilk dəfə ova gedən ovçunun üzünə tülkü qanı yaxmaq*; **4.** *məc. (bir şeyə)* öyrətmək

**blood-bath** ['blʌdba:θ] *n* qırğın, qan gölü

**blood-brother** ['blʌd.brʌðəʳ] *n* **1.** atadan bir anadan ayrı/atabir anaayrı qardaş; **2.** siğə qardaş

**blood-curdling** ['blʌd.kə:dlıŋ] *adj* qandonduran, dəhşətli; ~ **sight** qandonduran / dəhşətli mənzərə

**blood-donor** ['blʌd'dounəʳ] *n tib.* donor *(yaralılara, xəstələrə köçürülmək üçün qanını verən adam)*

**blooded** ['blʌdıd] *adj* **1.** cins, əsl, safqanlı; ~ **horse** cins at; ~ **dog** cins it; **2.** qana boyanmış, qanlı, qana batmış

**blood-group** ['blʌdgru:p] *n tib.* qan qrupu

**blood-guilty** ['blʌd.gıltı] *adj hüq.* qətldə günahı olan

**blood-heat** ['blʌdhi:t] *n* bədənin normal temperaturu / hərarəti

**blood-horse** ['blʌdhɔ:s] *n* cins at

**bloodhound** ['blʌdhaund] *n* **1.** axtarıcı it *(cinayətkarı və ya oğurlanmış şeyi axtarıb tapan cins it)*; **2.** xəfiyyə; **3.** qana susamış / qaniçən / qana həris adam

**bloodiness** ['blʌdınıs] *n* **1.** qaniçicilik, qansoranlıq, qana hərislik; **2.** qan tökmə, qırğın

**bloodless** ['blʌdlıs] *adj* **1.** qansız, qanı az; solğun, rəngi qaçmış; ~ **gums** qansız damaqlar; ~ **lips** qansız /solğun dodaqlar; ~ **victory** qansız / qan axıtmadan əldə edilən qələbə; **2.** cansız, ölü, ölgün; **3.** rəhmsiz, daşürəkli; şövqsüz, ehtirassız

**blood-letting** ['blʌd.letıŋ] *n* qan alma, qan buraxma

**blood-lust** ['blʌdlʌst] *n* qana susama

**blood-money** ['blʌd.mʌnı] *n* **1.** qatilə verilən pul; **2.** qətlə şahidlik edən adama verilən pul; **3.** ağır iş üçün verilən pul

**blood orange** ['blʌd'ɔrındʒ] *n bot.* korolyok *(içi qırmızı portağal növü)*

**blood-poisoning** ['blʌd.pɔıznıŋ] *n* qanın zəhərlənməsi

**blood-red** ['blʌd'red] *adj* qanqırmızı, qan kimi qırmızı

**bloodshed** ['blʌdʃed] *n* qantökmə, qırğın

**bloodshot** ['blʌdʃɔt] *adj* qızarmış *(göz haq.); His eyes were bloodshot from too much drinking Həddən artıq çox içdiyindən onun gözləri qıpqırmızı qızarmışdı*

**bloodstain** ['blʌdsteın] *n* qan ləkəsi; *There were bloodstains on the floor where the men had been fighting Adamların vuruşduğu yerdə döşəmədə qan ləkələri vardı*

**bloodstained** ['blʌdsteınd] *adj* **1.** qanlı, qana bulanmış; **2.** qanla ləkələnmiş, qətldə günahkar; *This castle has a bloodstained history Bu qəsr qanlı tarixə malikdir*

**blood-stroke** ['blʌdstrouk] *n tib.* qansızma

**blood-sucker** ['blʌd.sʌkəʳ] *n* **1.** zəli; **2.** qaniçən, parazit; **3.** istismarçı

**bloodthirsty** ['blʌd.θə:stı] *adj* qaniçən, qansoran, qana həris, qana susamış, adamcıl

**blood-transfusion** ['blʌdtrəns'fju:ʒn] *n tib.* qanköçürmə

**blood-vessel** ['blʌd.vesl] *n* qan damarı

**bloody**[1] ['blʌdı] *adj* **1.** qana boyanmış, qanlı; qana bulaşmış/batmış; **2.** qanayan, qanı axan; ~ **nose** qanayan burun; **3.** qanlı; ~ **battle** qanlı döyüş / vuruş; ~ **flux** *tib.* qanlı ishal; ~ **vomit** qanlı qusuntu; **4.** lənətə gəlmiş *(söyüş)*; ~ **liar** lənətə gəlmiş yalançı;

◊ **to wave a** ~ **shirt** *amer.* ehtirasları qızışdırmaq

**bloody**[2] ['blʌdı] *v* qanatmaq, qana boyamaq / bulamaq

**bloody-mary** [.blʌdı'meərı] *n* araq və tomat şirəsinin qatışığından hazırlanmış içki

**bloody-minded** ['blʌdı'maındıd] *adj* **1.** rəhmsiz, amansız, insafsız, qəddar, zalım, daşürəkli; **2.** qaniçən, qansoran, qana həris



**bloody-mindedness** ['blʌdı'maındıdnıs] *n* **1.** rəhmsizlik, amansızlıq, qəddarlıq, zalımlıq; **2.** qaniçənlik, qansoranlıq, qana hərislik

**bloom**[1] [blu:m] *n* **1.** çiçək, çiçəkləmə; **to burst into** ~ çiçəkləmək, çiçək açmaq; **2.** çiçəklənmə; yüksəliş, tərəqqi, inkişaf; **in full** ~ tam çiçəklənmə *(güc, qüvvə və s.)*; ~ **of youth** gəncliyin çiçəklənməsi, **to take the** ~ **off** *smth.* bir şeyi çiçəklənmə dövründə məhv etmək

**bloom**[2] [blu:m] *v* **1.** çiçəkləmək, çiçək / gül açma; *The apple trees are blooming Alma ağacları çiçək açır / çiçəkləyir;* **2.** gülzara çevirmək; **to make the desert** ~ səhranı gülzara çevirmək; **3.** gül / çiçək kimi açılmaq *(xüs. qadın haq.)*; ~**ing with health and beauty** sağlamlıqdan və gözəllikdən gül kimi açılmaq; *She is/ looks blooming after her holiday Məzuniyyətdən sonra o, çox gümrah görünür;* **4.** inkişaf / tərəqqi etmək

**bloomers** ['blu:məz] *n pl XIX əsrin sonlarında qadınların Avropada və Amerikada geydikləri dizdən büzməli şalvar*

**blossom**[1] ['blɔsəm] *n* çiçək *(adət. meyvə verən ağac və kol bitkilərində)*; **apple** ~**s** alma çiçəkləri; **a tree covered in** ~ çiçəklə örtülü / örtülmüş ağac; **to bear** ~ çiçək açmaq, çiçəkləmək; **a friendship in full** ~ çiçəklənən dostluq

**blossom**[2] ['blɔsəm] *v* **1.** çiçəkləmək, çiçək açmaq; *The apple trees are blossoming Alma ağacları çiçəkləyir / çiçək açır;* **2.** inkişaf/tərəqqi etmək; çiçəklənmək; *Jane blossomed out into a charming girl Ceyn füsunkar bir qız olub*

**blot**[1] [blɔt] *n* **1.** ləkə; **a** ~ **of ink on the paper** kağız üzərində mürəkkəb ləkəsi; ~ **on** *smb.'s* **honour/reputation** bir kəsin ficdanında/adında ləkə; **2.** biabırçılıq, rüsvayçılıq, təhqir, həqarət

**blot**[2] [blɔt] *v* **1.** ləkə salmaq; çirkləndirmək; çirklənmək; **fabric that blots** çirk götürən parça; **2.** ləkələmək, biabır/rüsvay etmək; **3.** suyunu çəkmək, qurutmaq *(suçəkən kağızla)*; **4.** qabağını tutmaq/ kəsmək, pərdələmək; *The Moon was blotted by the Earth's shade Yerin kölgəsi ayın qabağını tutdu;*

◊ **to** ~ *one's* **copybook** öz adını ləkələmək

**blotch** [blɔtʃ] *n* **1.** sızanaq, civzə; **2.** ləkə; **a** ~ **of ink** mürəkkəb ləkəsi; *There was a blotch of ink on his shirt Onun köynəyində bir mürəkkəb ləkəsi vardı*

**blotchy** ['blɔtʃı] *adj* **1.** sızanaqlı; **a** ~ **skin** sızanaqlı dəri; **2.** ləkəli; **a** ~ **dress** ləkəli paltar

**blotter** ['blɔtəʳ] *n* **1.** qurudan/basma/suçəkən kağız; **2.** cızma-qaraçı, qaralamaçı *(pis/dəyərsiz yazıçı və s.)*; **3.** polis idarələrində qeydiyyat kitabı; **police** ~ müvəqqəti həbs olunanları qeydiyyata almaq üçün jurnal

**blotting** ['blɔtıŋ] *n* **1.** islanma, su çəkmə; **2.** silmə, silinmə *(yazı haq.)*, pozma, pozulma; **3.** ləkə, mürəkkəb ləkəsi

**blotting-case** ['blɔtıŋkeıs] *n* büvar *(içinə kağız, konvert və s. qoymaq üçün qovluq)*

**blotting-out** ['blɔtıŋ'aut] *n* silmə, silinmə; pozma, pozulma; məhv / yox etmə

**blotting-pad** ['blɔtıŋpæd] *n* suçəkənli bloknot

**blotting-paper** ['blɔtıŋ.peıpəʳ] *n* qurudan / basma / suçəkən kağız

**blouse** [blauz] *n* **1.** bluzka; **2.** bluza *(üst köynəyi)*, gen kofta/gödəkçə; **3.** *hərb.* gödəkçə; tujurka *(pencək)*; kitel *(hərbçilər üçün pencək)*

**blow**[1] [blou] *n* I **1.** zərbə; **retaliatory** ~ cavab zərbəsi; qisas; **illegal** ~ *id.* qadağan olunmuş zərbə; **at a/one** ~ bir zərbə ilə, bir zərbədə; *He knocked them both down with one blow O onların hər ikisini bir zərbə ilə yerə sərdi;* **to administer/to deal/to deliver/to strike a** ~ zərbə endirmək; **to come/to fall/to get to** ~**s** davaya/vuruşa / savaşa girişmək; davaya/savaşa başlamaq; **to exchange** ~**s** dalaşmaq, vuruşmaq; **to rain** ~**s upon** *smb.* bir kəsin üstünə zərbələr yağdırmaq; **to strike a** ~ **for** kömək etmək; **to strike a** ~ **against** əks-təsir göstərmək, müqavimət göstərmək; **to aim a** ~ **at** *smb.'s* **authority** bir kəsi nüfuzdan salmaq; **2.** bədbəxtlik, taleyin zərbəsi; *It was a great blow to her when her mother died Anasının ölümü onun üçün böyük bədbəxtlik idi;*

◊ *The first blow is half the battle at. söz.* ≅ *Birinci zərbə döyüşün yarısıdır*

**blow** [blou] *n* II **1.** əsmə; küləyin əsməsi; **to get oneself a** ~ təmiz hava ilə nəfəs almaq; **2.** nəfəsli musiqi alətinin səsi; **3.** burnunu silərkən çıxarılan səs; **4.** *d.d.* lovğalıq, gopçuluq; lovğa, gopçu, özünü öyən *(adam)*

**blow** [blou] *n* III **1.** çiçək, çiçəkləmə; **2.** *məc.* çiçəklənmə; yüksəliş, tərəqqi

**blow**[2] [blou] *v* I *(pt* **blew** [blu:]; *pp* **blown** [bloun]) **1.** əsmək *(külək haq.)*; *It was blowing hard Güclü külək əsirdi;* **2.** üfürmək; **to** ~ *one's* **food to make it cool** yeməyini soyutmaq üçün onu üfürmək; **to** ~ *one's* **fingers to make them warm** isitmək üçün barmaqlarını üfürmək; *I blew the dust off the book Mən tozu kitabın üstündən üfürdüm;* **to** ~ **glass** şüşə üfürmək; **3.** aparmaq *(külək haq.)*; *The wind has blown my hat Külək papağımı aparıb;* **4.** çalmaq *(şeypur haq.)*; **to** ~ **a horn** şeypur çalmaq; **5.** töyşümək; *He was blowing as he climbed the stairs O, pilləkənləri qalxarkən töyşüyürdü;* **6.** göyə sovurmaq, puça çıxarmaq; *I blew $ 1000 at cards Mən kartda 1000 $ göyə sovurdum; I've blown my chance with her by saying that Bunu deməklə mən ona olan şansımı puça çıxartdım/ göyə sovurdum;* **7.** qaçmaq, aradan çıxmaq; *Let's blow before they catch us? Gəl / Gəlin onlar bizi tutmamış qaçaq / aradan çıxaq;* **8.** burnunu silmək; *Blow your nose well Burnunu/Burnunuzu yaxşı-yaxşı sil/silin;* **9.** aşkar etmək, yay-

maq *(xəbəri, şayiəni və s.)*; **10.** lovğalanmaq, gopa basmaq, özünü öymək;
◊ **to ~ one's brain** başına güllə sıxmaq, özünü güllə ilə öldürmək; **to ~ a kiss** öpüş göndərmək *(uzaqdan)*; **to ~ hopes** ümidləri puç etmək; **to ~ one's own horn /trumpet** özünü tərifləmək /öymək; lovğalanmaq; **to ~ hot and cold** mütəmadi olaraq öz fikrini / mövqeyini dəyişmək

**blow** [blou] *v* II *(pt* **blew**; *pp* **blown)** **1.** çiçəklənmək, çiçək açmaq; **2.** inkişaf / tərəqqi etmək

**blowen** ['blouən] *n kob.* qız; fahişə, qəhbə

**blow down** ['bloudaun] *v* yıxmaq; *The storm blew several trees down in the park Tufan parkda bir neçə ağacı yıxdı*

**blower** ['blouəʳ] *n* **1.** truba / boru çalan, kərənayçı; **2.** balina, kit; **3.** *amer.* lovğa, özünü öyən, gopçu; **4.** *kob.* fahişə, qəhbə; **5.** çərənçi, boşboğaz, naqqal; **6.** *tex.* havaverən maşın; ventilyator

**blow-fly** ['blouflaı] *n* ət milçəyi

**blowhard** ['blouha:d] *n d.d.* özünü öyən adam, gopçu adam, lovğa

**blow in** ['blouın] *v* qəfildən/gözlənilmədən gəlmək; *Jim has just blown in; we weren't expecting him till Sunday Cim bu saat gözlənilmədən gəlib; biz onu bazar gününə kimi gözləmirdik*

**blow out** ['blouaut] *v* **1.** söndürmək; üfürüb söndürmək; *Jane blew the flame out Ceyn alovu üfürüb söndürdü*; **2.** partlamaq; *The tyre blew out as I was driving to work Mən işə gedərkən təkər partladı*; **3.** sındırmaq; *The explosion blew the windows out Partlayış pəncərələri sındırdı*

**blow over** ['blououvəʳ] *v* dayanmaq, kəsmək; *The storm has blown over Tufan dayanıb / kəsib*

**blow up** ['blouʌp] *v* **1.** uçurmaq, partlatmaq; **to ~ a bridge** körpünü uçurmaq / partlatmaq; **2.** hava ilə doldurmaq; hava ilə doldurub bərkitmək; *Blow up the tyre before you set off Yola düşməzdən öncə /əvvəl təkəri doldur/doldurun;* **3.** böyütmək *(şəkli)*; şişirtmək; *The photographer blew the child's picture up and entered it in a competition Fotoqraf uşağın şəklini böyütdü və onu müsabiqəyə təqdim etdi; This small matter has been blown up in order to cause difficulty between 2 nations İki xalq arasında çətinlik yaratmaq üçün bu kiçik məsələ şişirdilib;* **4.** qəzəblənmək, hirslənmək; cin atına minmək; *His father blew up when she arrived home in the morning O, səhər evə gələndə atası qəzəbləndi / cin atına mindi*

**blowy** ['blouı] *adj* küləkli; **a ~ day** küləkli gün

**blowze** [blauz] *n kob.* şişman qırmızıyanaq qadın / arvad

**blowzy** ['blauzı] *adj* şişman, çirkin, qırmızısifət və səliqəsiz geyinmiş *(qadın haq.)*

**blub** [blʌb] *n* **1.** şişmə, köpmə, qabarma; şiş, köp *(suvaq və s. haq.)*; **2.** suluq, qabar, hava tuluğu

**blubber**[1] ['blʌbəʳ] *n* **1.** dəniz heyvanlarının *(balina, suiti və s.)* əridilmiş piyi; **2.** meduza *(dəniz heyvanı)*; **3.** ağlama, ağlamaq səsi, fəryad, zarıltı; *Stop that blubber! Ağlamağı kəs!/kəsin!* **4.** qabarcıq *(suda)*

**blubber**[2] ['blʌbəʳ] *adj* qalın *(dodaq haq.)*

**blubber**[3] ['blʌbəʳ] *v* ucadan ağlamaq, hönkürmək, fəryad etmək; bağırmaq, nərildəmək; *Do stop blubbering! I can't hear what you are saying Hönkürtünü kəs/ kəsin! Nə dediyini/dediyinizi anlaya bilmirəm*

**blubber out** ['blʌbəʳaut] *v* hönkürə-hönkürə danışmaq / demək

**bludgeon**[1] ['blʌdʒən] *n* dəyənək; **to strike with a ~** dəyənəklə vurmaq

**bludgeon**[2] ['blʌdʒən] *v* dəyənəkləmək, dəyənəklə döymək/vurmaq; *The thief bludgeoned the old man to death Oğru qoca kişini ölənə qədər dəyənəklə döydü / dəyənəklədi*

**bludgeon into** ['blʌbʒənıntə] *v* bir şeyi etməyə məcbur/vadar etmək; *He was bludgeoned into paying the money Onu pulu verməyə məcbur / vadar etdilər*

**blue**[1] [blu:] *n* **1.** göy / mavi rəng; **Oxford ~** tünd göy / mavi rəng; **Cambridge ~** açıq göy / mavi rəng; **light ~** açıq mavi / göy; *Light blue would be a nice colour for the curtains Pərdə üçün açıq mavi gözəl rəng ola bilərdi;* **dressed in ~** mavi/göy geyimli; mavi / göy geyinmiş; **2.** mavi / göy boya; **3.** lil *(paltar üçün)*; **4.: the ~** səma; dəniz, okean; **5.** göy / mavi paltar; **men / gentlemen / boys in ~** polis; dənizçi; **the ~s** mavi/göy geyimli ordu; **6.** tori (mühafizəkarlar) partiyasının rəngi; tori/mühafizəkarlar partiyasının üzvü; **true ~** əsl tori; **7.** universitet komandasının üzvü; **Dark Blues** Oxford komandası; **Light Blues** Kembric komandası; **8.** *pl d.d.* qüssə, darıxma, xiffət; **to have the ~s** ürəyi sıxılmab, xiffət etmək, qüssələnmək;
◊ **to be in the ~ 1)** yolunu azmaq, yolundan çıxmaq; **2)** müvəffəqiyyətsizliyə uğramaq, məğlub olmaq; **out of the ~** qəfildən, qəflətən, gözlənilmədən; *John arrived out of the blue Con qəfildən / gözlənilmədən gəldi*

**blue**[2] [blu:] *adj* **(bluer, bluest) 1.** göy, mavi; **~ sea** göy/ mavi dəniz; **~ sky** mavi səma; **~ dress** göy /mavi paltar; **dark ~** tünd göy / mavi; **light ~** açıq göy/mavi; **~ milk** üzü alınmış süd; **~ eyes 1)** göy/mavi gözlər; **2)** gözün altında göyərti; **2.** göyərmiş; **to go/to be ~ with cold** soyuqdan göyərmək; *Her hands were blue with cold Onun əlləri soyuqdan göyərmişdi; Baby cried till it was blue in the face Uşaq sifəti göyərənə qədər qışqırdı; You may talk till you are blue in the face Sən / Siz səsin / səsiniz batana kimi danışa bilərsən /bilərsiniz;* **3.** qorxmuş; qəmgin, kədərli, hüznlü; **to look ~** qüssəli/qəmgin/kədərli/hüznlü görünmək; *Things look blue İşlər xarabdır / pisdir; I am blue Mənim kefim yoxdur, Mən qüssəliyəm / kədərliyəm;* **4.** sədaqətli, etibarlı; *He is true blue to his principles O öz prinsiplərinə sadiqdir;* **5.** tori partiyasına aid olan; **to vote ~** tori partiyasına səs vermək; **6.** *d.d.* ədəbsiz, nalayiq, yaramaz; **to tell ~ stories** nalayiq / ədəbsiz lətifələr danışmaq; **7.** *id.* **~ line** tennis topunu vurmaq üçün xətt;
◊ **~ baby** ürəyi xəstə doğulmuş uşaq; **~ water** açıq dəniz; **~ blood** aristokrat, yüksək silkə mənsub adam; **to cry / to shout ~ murder** bağırmaq, var gücü ilə qışqırmaq, hay-haray salmaq; *By all that is blue! Nəyə desəniz and içirəm!* **to be ~ in the face** təəccübdən ağzını açmaq; **to make / to turn the air ~** söymək, söyüş söymək



**blue**[3] [blu:] *v* **1.** göy / mavi boyamaq; göy / mavi rəngə boyamaq; **2.** göyərmək; **3.** paltarı lilləmək

**blue-bell** ['blu:bel] *n bot.* **1.** qar çiçəyi; **2.** zəngçiçəyi

**blue-berry** ['blu:bərı] *n bot.* qaragilə, mərcanı; mərsin; cır mərsin *(şimal bataqlıqlarında bitən giləmeyvə)*

**blue-bird** ['blu:bə:d] *n zool.* qaratoyuq

**blue-black** ['blu:blæk] *adj* göy-qara

**bluebottle** ['blu:,bɔtl] *n bot.* peyğəmbərçiçəyi *(açıq göy rəngli çöl çiçəyi)*

**blue-eyed** ['blu:aıd] *adj* göygöz, mavi gözlü

**blue-film** [,blu:'fılm] *n* pornoqrafiya filmi

**blue-law** ['blu:lɔ:] *n* seks qaydalarına nəzarət edən qanun

**blue-moon** [,blu:'mu:n] *n* uzun müddət / vaxt; *Where have you been? I haven't seen you in a blue moon Harada idin / idiniz? Mən səni / sizi uzun müddətdir görməmişəm/görmürəm*

**blueness** ['blu:nıs] *n* göylük

**blue plant** ['blu:pla:nt] *n bot.* küncüt

**blueprint**[1] ['blu:'prınt] *n* **1.** lil; **2.** çertyojun həssas kağız üzərində surəti; **3.** plan, layihə, proqram; **a ~ for a control system** nəzarət sistemi üçün layihə; **national referendum ~** milli referendum layihəsi

**blueprint**[2] ['blu:'prınt] *v* **1.** həssas kağız üzərində çertyojun surətini çıxarmaq; **2.** planlaşdırmaq, yaratmaq, hazırlamaq, sxemini cızmaq

**bluey** ['blu:ı] *adj* abı, göyümtül

**bluff**[1] [blʌf] *n* I uçurum, sıldırım sahil/qaya, sıldırım; *They were sitting on a bluff and watched the sea Onlar sıldırımın başında oturub dənizi seyr edirdilər*

**bluff** [blʌf] *n* II **1.** *d.d.* yalan, uydurma, qaraqorxu; *The offer was a bluff Bu təklif yalan / uydurma idi;* **to call smb.'s ~** yalana uymamaq; bir kəsin yalanını ifşa etmək / tutmaq; **2.** yalançı, yalan danışan *(adam)*

**bluff**[2] [blʌf] *adj* **1.** dik, şaquli; sərt; sıldırımlı, uçurumlu; **2.** qabatəhər; **a ~ but not unpleasant countenance** qabatəhər lakin xoşa gələn sifət / görkəm

**bluff**[3] [blʌf] *v d.d.* aldatmaq, yalandan hədə-qorxu gəlmək, hədələmək; *He was bluffed by his opponent Düşməni ona kələk/hədə-qorxu gəldi*

**bluffer** ['blʌfəʳ] *n* yalançı, adamaldadan

**bluffy** ['blʌfı] *adj* **1.** girintili-çıxıntılı *(sahil xətti haq.)*; dik, dimdik, sıldırım, yalçın; şaquli; **2.** qabatəhər, kobudtəhər, bir az qaba / kobud; **a fat, sturdy ~ old woman** şişman, enlikürək qabatəhər qoca arvad/qadın

**bluish** ['blu:ıʃ] *adj* göyümtül, mavitəhər, göytəhər

**blunder**[1] ['blʌndəʳ] *n* **1.** kobud səhv; *He committed/made a blunder O, kobud səhv etdi;* **2.** *arx.* çaxnaşma, vəlvələ, həyəcan

**blunder**[2] ['blʌndəʳ] *v* **1.** kobud səhv etmək / buraxmaq; müvəffəqiyyətsizliyə uğramaq; **2.** korlamaq, xarab etmək, dolaşdırmaq, dolaşıq salmaq, qarışdırmaq, qarışıq salmaq; öhdəsindən gələ bilməmək *(bir şeyin)*; *He blundered through his examination paper O, imtahan yazısında səhv buraxdı/etdi; The negotiation was blundered by him O, danışıqları dolaşdırdı / dolaşığa saldı;* **3.** kor-koranə getmək, əl ilə yoxlaya-yoxlaya / əl ilə axtara-axtara getmək; *(həm də* **to ~ about, to ~ along)** *He blundered through the dark forest O, qaranlıq meşədə kor-koranə dolaşdı;* **to ~ one's way** yolunu kor-koranə getmək; **to ~ through one's work** kor-koranə işləmək; **4. (on, upon)** təsadüfən rast gəlmək/olmaq, təsadüf etmək, rastlaşmaq, qarşısına çıxmaq; **to ~ against smb. /smth.** bir kəsə / bir şeyə təsadüfən rast gəlmək; *He blundered upon / on the truth O, təsadüfən həqiqəti öyrəndi;* **to ~ away** əldən buraxmaq; **to ~ away one's chance** imkanı / şansı əldən buraxmaq; **to ~ out** ağzından qaçırmaq; boş-boş/gic-gic/axmaq-axmaq danışmaq; *He blundered a secret O, sirri ağzından qaçırdı*

**blunderbuss** ['blʌndəbʌs] *n* **1.** *tar.* gödəklüləli tüfəng; **2.** = **blunderhead**

**blunderer**[1] ['blʌndərəʳ] *n* axmaq, gic, sarsaq; *You blunderer! Look what you have done Ay axmaq! Bax gör (sən) nə etmisən!*

**blunderhead** ['blʌndəhed] *n d.d.* gic, axmaq, küt, qanmaz, korazehin, sarsaq, səfeh

**blundering** ['blʌndərıŋ] *adj* **1.** səhv, yanlış; **~ citations and erroneous interpretations** yanlış iqtibaslar və səhv izahatlar; **2.** bacarıqsız, ləng, ağırtərpənən; **with ~ fingers** yöndəmsiz, bacarıqsız

**blunt**[1] [blʌnt] *n* **1.** gözəmə iynəsi, gözəmək üçün iynə; **2.** *d.d.* gic, axmaq, sarsaq

**blunt**[2] [blʌnt] *adj* **(-er, -est ) 1.** küt *(bıçaq, qayçı, karandaş və s.)*; **a ~ knife** küt bıçaq; **~ pencil** küt karandaş; **scissors with ~ ends** ucu küt olan qayçı; **to make ~** kütləşdirmək; *Too much alcohol makes your senses blunt Həddən artıq alkaqollu içki sənin / sizin hisslərini / hissləri-*

*nizi kütləşdirir;* 2. kobud, kobudtəhər, qaba; qabatəhər; a ~ **man** kobud / qaba adam; *He was blunt in his bearings O, hərəkətlərində qabatəhər / kobudtəhər idi*

**blunt³** [blʌnt] *v* 1. kütləşdirmək; *Their sensitiveness was blunted Onların həssaslığı kütləşmişdi;* **to ~ the effect** təəssüratı zəifləmək; **to ~ the edge of the pain** ağrının kəskinliyini kütləşdirmək; 2. korşalmaq, kütləşmək; *The edge of this knife will never blunt Bu bıçağın ağzı heç vaxt korşalmayacaq / kütləşməyəcək*

**bluntly** [ˈblʌntlı] *adv* açığı, açıq-aydın; düzünü; *To speak bluntly, this student is sure to fail Açığını desək, bu tələbə kəsiləcək / imtahan verə bilməyəcək*

**blur¹** [bləːˈ] *n* 1. ləkə, mürəkkəb ləkəsi; 2. qaralama, qaraltı; aydın görünməyən şey; *The houses appeared as a blur in the mist Evlər çənin / dumanın içində qaraltı kimi görünürdü;* 3. ləkə, qüsur; **a ~ on his honour** onun vicdanında ləkə; **to cast a ~ upon** *smb.'s* **reputation** bir kəsin adını ləkələmək

**blur²** [bləːˈ] *v* (**-rr-**) 1. çirklətmək, ləkə salmaq, bulamaq; 2. dumanlandırmaq, kütləşdirmək; *Tears blurred her eyes Göz yaşı onun gözlərini dumanlandırdı; The tracks are blurred İzlər az qala silinə;* 3. ləkələmək *(adı, şöhrəti və s.)*

**blurb¹** [bləːb] *n* reklam elanı *(kitabın cildində və s.)*

**blurb²** [bləːb] *v* reklam elanı vermək, reklam vasitəsi ilə elan etmək

**blurred** [bləːd] *adj* 1. çirklənmiş, mürəkkəbə bulaşmış; ~ **finger** mürəkkəbə batmış / bulaşmış barmaq; 2. aydın/aşkar olmayan, anlaşılmayan, anlaşılmaz; qeyri-müəyyən; dumanlı; yayğın, bulanmış; ~ **impression** dumanlı təəssürat; ~ **image** yayğın təsvir; **to have a ~ vision of** *smth.* bir şey haqqında dumanlı / yayğın təsəvvürə malik olmaq; ~ **photograph** tutqun / solğun fotoşəkil

**blurt¹** [bləːt] *n* düşünülməmiş deyilən söz, ehtiyatsız deyilmiş fikir

**blurt²** [bləːt] *v* (**out**) ağzından qaçırmaq, fikirləşmədən demək; açıb danışmaq; *He blurted out the whole story O, bütün əhvalatı açıb danışdı*

**blush¹** [blʌʃ] *n* 1. utanma, xəcalət, xəcalət çəkmə, pərtlik; **to put someone to the ~** bir kəsi utandırmaq, bir kəsə xəcalət vermək; *She put me to the blush by her foolish behaviour O, axmaq hərəkəti ilə məni utandırdı; She turned away to hide her blushes Xəcalət çəkməyini gizlətmək üçün o, üzünü döndərdi; She said it with a blush O bunu utana-utana dedi;* 2. al, qırmızımtıl/qırmızı rəng qırmızımtraq, qırmızı rəng; 3. *arx.* baxış, baxma; **at (the) first ~** ilk baxışda

**blush²** [blʌʃ] *v* qızarmaq, utanmaq; utanmaqdan pörtmək/qızarmaq; xəcalət çəkmək; **to ~ like a rose** lalə kimi qıpqırmızı olmaq / qızarmaq; **to ~ to the roots of** *one's* **hair** tüklərinin dibinə qədər qızarmaq; *I blush for you Mən sənin / sizin yerinə/yerinizə utanıram; I don't blush to own that I am wrong Mən səhv / haqsız olduğumu etiraf etməyə utanmıram*

**blushful** [ˈblʌʃfl] *adj* 1. utancaq; həyalı; 2. al, qırmızı, çəhrayı

**blushing** [ˈblʌʃıŋ] *adj* təvazökar, utancaq, utanan, həyalı; ~ **bride** həyalı gəlin

**blushingly** [ˈblʌʃıŋlı] *adv* utana-utana, qızara-qızara, utancaqlıqla, çəkinə-çəkinə

**bluster¹** [ˈblʌstəˈ] *n* 1. tufanın uğultusu/ gurultusu; 2. nəfəsli alətlərin səsi; 3. görünməmiş səs-küy; 4. boş hədə; 5. gurultulu / təmtəraqlı sözlər; 6. lovğalıq, gopçuluq

**bluster²** [ˈblʌstəˈ] *v* 1. guruldamaq, vıyıldamaq; coşmaq *(tufan haq.)*; 2. səs/səs-küy salmaq; gurultu qoparmaq, guruldamaq *(dəniz)*, uğuldamaq *(külək)*; 3. səs-küylə hədələmək; **to ~ out threats** 1) sək-küylə hədə yağdırmaq; 2) lovğalanmaq, özünü öymək, öyünmək

**blusterer** [ˈblʌstərəˈ] *n* 1. səs-küylü/dalaşqan/davakar adam; 2. lovğa, özünü öyən, gopçu

**blusterous** [ˈblʌstərəs] *adj* 1. coşqun; azğın, qızğın, qudurğan; boranlı, tufanlı, küləkli; **a ~ winter day** boranlı / tufanlı qış günü; 2. səslikülylü, gurultulu; 3. lovğa, özünü öyən, öyünən

**blustery** [ˈblʌstərı] *adj* = **blusterous**

**boar** [bɔː] *n zool.* 1. qaban, erkək donuz; 2. vəhşi qaban; 3. qaban əti

**board¹** [bɔːd] *n* 1. taxta; lövhə; *The teacher wrote the sum on the board Müəllim nəticəni lövhədə yazdı;* **notice ~** elan lövhəsi; **ironing ~** paltar ütüləmək üçün taxta; **bed of ~s** taxtadan qayrılmış çarpayı, taxt; 2. səhnə; **to go on the ~s** səhnəyə çıxmaq, aktyor olmaq; 3. rəf, ləmə, taxça; 4. yataq yeri *(vaqonda)*; 5. bort *(gəminin, avtomobilin, bilyardın, paltarın və s. yanı/kənarı)*; **on ~** gəmidə, gəminin göyərtəsində; **to come / to go on ~** gəmiyə minmək; **to go by the ~** gəmidən atılmaq *(dənizə)*; 6. idarə, idarə etmə; şura; kollegiya; komissiya; ~ **of examiners** dövlət imtahan komissiyası; ~ **of directors** direktorlar şurası; **Board of Trade** ticarət palatası *(ABŞ-da)*; 7. yeməyin qiyməti; *I pay 100$ a week for board and lodging Mən yeməyimə və yatmağıma həftədə 100$ verirəm;* 8. ərzaq kəsmək üçün taxta; *Put the bread on the board before cutting it Çörəyi taxtanın üstünə qoyub kəs/kəsin;*

◊ **above ~** düz, doğru, namusla, vicdanla; *There's nothing secret about what we're doing, it is all perfectly above board Nə ediriksə, vicdanla edirik, bizdə gizli heç bir şey yoxdur;* **under ~** alçaqcasına, əclafcasına, namərdcəsinə; ~ **by ~** yan-yana, böyür-böyürə

**board²** [bɔːd] *v* 1. döşəmə/taxta vurmaq, taxta ilə örtmək, taxtalamaq; **to ~ a window / a door** pəncərəni / qapını taxtalamaq; *Board the window Pəncərəni taxtala / taxtalayın;* 2. nahar etmək, xörək yemək; yemək yemək; **to ~ with** *smb.* bir kəslə evində nahar etmək/yemək yemək; 3. pulunu ödəməklə yataq və yemək vermək; yemək vermək; *She boards two boys O, iki oğlana yemək verir;* 4. *amer.* gəmiyə minmək; qatara/tramvaya təyyarəyə minmək; 5. *d.d.* təzə /yeni gələn əsgərləri tibbi müayinədən keçirmək; *He was boarded yesterday Onu tibbi müayinədən dünən keçirdilər*

**boarder** [ˈbɔːdəˈ] *n* 1. *özgə ailədə yaşayıb pulla mənzil və yeməkdən istifadə edən kirayənişin;* 2. internat şagirdi

**boarding** [ˈbɔːdıŋ] *n* 1. taxta ilə haşiyələmə / köbələmə; taxta vurma; 2. lövhə; taxta; *The windows were covered with boarding Pəncərələr taxta ilə örtülmüşdü, Pəncərələr taxtalanmışdı*

**boarding-house** [ˈbɔːdıŋhaus] *n* 1. pansion; 2. stol qoyulmuş otaq

**boarding-school** [ˈbɔːdıŋskuːl] *n* internat məktəb; **a small country ~** balaca kənd internat məktəbi

**boardroom** [ˈbɔːdruːm] *n şirkət direktorlarının iclas keçirdikləri otaq*

**boards** [bɔːdz] *n* 1. kitab cildi; **a book in cloth ~** parça cildli kitab; 2. *arx.* səhnə; *He has been on boards all his life O bütün ömrü boyu səhnədə olub (yəni aktyor olub)*

**boardwalk** [ˈbɔːdwɔːk] *n amer.* 1. taxta döşənmiş yol *(adət. dəniz qırağında)*; 2. çimərlikdə gəzinti

**boarish** [ˈbɔːrıʃ] *adj* 1. qaban; ~ **bristle** qaban tükü / qılı; 2. kobud, qaba; ədəbsiz, nəzakətsiz

**boast¹** [boust] *n* 1. lovğalıq; **to make ~ of** *smth.* bir şeylə lovğalanmaq; 2. iftixar obyekti / mövzusu; *The boy is her boast Oğlan onun iftixarıdır*

**boast²** [boust] *v* (**of, about**) 1. lovğalanmaq, özünü öymək /tərifləmək; **to ~ of / about** lovğalanmaq; *(bir şeyə görə) He boasted of /about the big fish he had caught O, tutduğu iri balıqla lovğalandı;* 2. fəxr etmək *(cansızlar haq.)*; *The town boasts of/about its gardens Şəhər öz bağları ilə fəxr edir*

**boaster** [ˈboustəˈ] *n* lovğa, gopçu, özünü öyən

**boastful** [ˈboustfl] *adj* lovğa, özünü öyən, öyünən, gopçu; **a ~ king** lovğa kral

**boastfully** [ˈboustfəlı] *adv* lovğa-lovğa; **to speak ~** lovğa-lovğa danışmaq

**boastfulness** [ˈboustfəlnıs] *n* lovğalıq, gopçuluq

**boat¹** [bout] *n* 1. qayıq; **pair-oar ~** ikiavarlı qayıq; **four-oar ~** dördavarlı qayıq; **a small fishing ~** balaca balıqçı qayığı; **to cross the river by ~** çayı qayıqla keçmək; **to cross the river in a ~** çayı qayıqda keçmək; 2. gəmi; **to go by ~** gəmi ilə getmək; *Are you going to America by boat or by air? Sən / Siz Amerikaya gəmi ilə, yoxsa təyyarə ilə gedirsən / gedirsiniz?* **to take the ~** gəmiyə minmək;

◊ **to be in the same ~** eyni vəziyyətdə olmaq; *If you lose your job, I'll lose mine, so we're both in the same boat Əgər sən/siz işini/işinizi itirsən/itirsəniz, mən də itirəcəm; biz ikimiz də eyni vəziyyətdəyik;* **to sail in the same ~** əlbir olmaq, birgə hərəkət etmək; **to miss the ~** imkanı / şansı əldən vermək; **to have an oar in every ~** hər işə qarışmaq, başını hər işə soxmaq; **to push the ~ out** əylənmək üçün xüsusi səy göstərmək və çox pul xərcləmək; *They really pushed the boat out for their daughter's wedding, and invited 400 people Onlar qızlarının toyuna 400 adam dəvət etdilər və həqiqətən də çox pul xərclədilər*

**boat²** [bout] *v* 1. su ilə daşımaq; 2. qayıqla gəzmək / getmək; *We boated up the river Biz qayıqla çay yuxarı getdik*

**boater** [ˈboutəˈ] *n* 1. qayıqçı; 2. qayıqda gəzən; avarçəkən; 3. iri həsir şlyapa

**boatful** [ˈboutful] *n* 1. ağzına qədər dolu olan qayıq, bir qayıq dolusu; 2. gəminin sərnişinləri və onun komandası

**boat-house** [ˈbouthaus] *n dən.* ellinq *(su kənarında qayıqların saxlanıldığı yer)*

**boating** [ˈboutıŋ] *n* 1. qayıq idmanı; 2. avar çəkmə; **to go ~** qayıqda gəzmək/gəzintiyə çıxmaq

**boatman** [ˈboutmən] *n* (*pl* **-men**) qayıqçı, qayıqsürən

**boat-race** [ˈboutreıs] *n id.* qayıqsürmə yarışı

**boatswain** [ˈbousn] *n (baş)* bosman *(gəmidə işlərin yerinə yetirilməsinə və bütün ləvazimatların qorunub saxlanılmasına cavabdeh şəxs)*

**boat-woman** [ˈbout.wumən] *n* (*pl* **-women**) qayıqçı qadın / qız

**bob¹** [bɔb] *n* I 1. qısa vurulmuş saç; qısa vurulmuş saç fasonu *(qadınlarda)*; **to wear** *one's* **hair in a ~** saçını gödək kəsdirmək; 2. buruq, burum, qıvrım *(saçda)*; 3. dəstə *(saç)*; **to twist up** *one's* **hair in a ~** saçını burub dəstədə bağlamaq; 4. qısa parik; 5. qısa kəsilmiş quyruq *(atda, itdə)*

**bob** [bɔb] *n* II 1. kəskin hərəkət, itələmə, təkan; **to bear/to shift a ~** tələsmək, tələsik hərəkət etmək; 2. reverans *(qadınların/qızların nəzakətlə əyilərək salam verməsi)*; 3. nəqərat; **to bear a ~** nəqərata qoşulmaq *(oxuyanlar haq.)*

**bob²** [bɔb] *adj d.d.* canlı, diri, diribaş, çevik; şən, şad, şux

**bob³** [bɔb] *v* (**-bb-**) I 1. saçını qısa kəsdirmək *(qadın haq.)*; **to have** *one's* **hair ~bed** saçını qısa kəsdirmək *(qadın haq.)*; *She has her hair bobbed O, saçını qısa kəsdirib;* 2. quyruğu qısa kəsmək *(atda, itdə)*

**bob** [bɔb] *v* (**-bb-**) II 1. yırğalanmaq, yellənmək; *A bottle was bobbing about in the sea Bir butulka dənizdə yırğalanırdı;* 2. (**up and down**) dingildəmək, atılmaq, tullanmaq, sıçramaq; *A boy was bobbing up and down on the horse: Oğlan atın üstündə atılıb düşürdü;* 3. dizlərini bükmək/qatlamaq; çömbəlmək; *He bobbed and the*

*stone missed him O çömbəldi və daş ona dəymədi;* 4. reverans etmək; 5. oynamaq, rəqs etmək
**bobbed** [bɔbd] *adj* gödək qırxılmış/kəsilmiş *(saç, quyruq və s. haq.)*
**bobbin** ['bɔbın] *n* 1. tağalaq, çarx *(sap üçün)*; 2. makara *(tikiş və toxuma maşınlarında)*
**bobby** ['bɔbı] *n* bobbi, polis nəfəri
**bobby-pin** ['bɔbıpın] *n* saç üçün sancaq
**bobcat** ['bɔbkæt] *n zool.* vaşaq, yazıpişiyi
**bob-tail**[1] ['bɔbteıl] *n* 1. gödək qırxılmış/kəsilmiş quyruq; 2. gödək qırxılmış at /it
**bob-tail**[2] ['bɔbteıl] *v* 1. quyruğunu gödək kəsmək/qırxmaq *(at, it haq.)*; 2. gödəltmək, qısaltmaq; *He bob-tailed his coat O, paltosunu gödəltdi*
**bob-tailed** ['bɔbteıld] *adj* quyruğu gödək qırxılmış / kəsilmiş
**bock** [bɔk] *n* 1. sərt tünd pivə *(alman pivəsi)*; 2. bir stəkan pivə; 3. fransız pivə parçı *(1/4 litr tutumlu)*
**bod** [bɔd] *n* oğlan, kişi
**bode**[1] [boud] *n* I *tar.* carçı, müjdəçi, xəbərgətirən
**bode** [boud] *n* II əlamət, nişanə
**bode**[2] [boud] *v* 1. qabaqcadan xəbər vermək / bildirmək; boyun olmaq, söz vermək; **to ~ ill / well** qabaqcadan pis / yaxşı xəbər vermək; *This bodes happy ending Bu, nəticənin xoşbəxtliklə qurtaracağını xəbər verir;* 2. qabaqcadan hiss etmək / duymaq, ürəyinə dammaq
**bode**[3] [boud] **to bide** *felinin pt, pp formaları*
**bodeful** ['boudfl] *adj* qorxunc, məşum, qorxulu, acıqlı, zəhmli, heybətli; bədbəxtlikdən xəbər verən; *There was a bodeful pause Ortaya məşum / qorxunc bir sükut çökdü*
**bodement** ['boudmənt] *n* 1. qabaqcadan xəbər vermə, gələcəyi xəbər vermə; 2. əlamət, nişanə; 3. bəd əməl, bəd fal
**bodice** ['bɔdıs] *n* 1. lif, döş *(qadın paltarının döşünü tutan hissəsi)*; 2. korsaj *(qadın tumanının enli kəməri)*; 3. lifçik, döşlük
**bodiless** ['bɔdılıs] *adj* cisimsiz, qeyri-maddi, qeyri-cismani
**bodily**[1] ['bɔdılı] *adj* cismani, cismi, fiziki; **~ fear** heyvani qorxu; **~ suffering** cismani əziyyət; *He likes to be sure of his bodily comforts O özünün cismani rahatlığına əmin olmaq istəyir*
**bodily**[2] ['bɔdılı] *adv* 1. şəxsən; şəxsən özü; *He came bodily O şəxsən özü gəldi;* 2. bütün, bütövlükdə, tam; tamamilə; *The building was transported bodily to another place Bina bütövlükdə başqa yerə köçürüldü; The audience rose bodily İştirakçılar bir nəfər kimi /bütövlükdə ayağa qalxdı*
**bodkin** ['bɔdkın] *n* 1. biz; 2. ucu küt uzun iynə; 3. saç üçün uzun sancaq
**body** ['bɔdı] *n* 1. cisim; əndam, vücud; *Absent in body, present in soul O cismani olaraq burada deyil, lakin qəlbən bizimlədir;* 2. bədən, gövdə; **to be wounded on *one's* ~** bədəndən yaralanmaq; *He had a wound on his leg and two more on his body Onun ayağında bir və bədənində daha iki yara vardı;* 3. cəsəd; *Where did they bury his body? Onlar onun cəsədini harada basdırdılar / dəfn etdilər;* 4. *d.d.* adam; **a decent ~** ədəbli / tərbiyəli / nəzakətli adam; 5. əsas hissə / bölmə; **the main ~** *harb.* əsas hissə/bölmə; **the ~ of the book** kitabın əsas hissəsi / bölməsi *(girişsiz, əlavəsiz)*; 6. maddə, cisim; **solid bodies** bərk maddələr / cisimlər; **liquid ~** maye cisim; **heavenly bodies** göy / səma cisimləri; *The sun, moon and stars are heavenly bodies Günəş, ay və ulduzlar göy cisimləridir;* 7. tündlük *(şərab haq.)*; *The wine has no body Şərabın heç tündlüyü yoxdur; I like a wine with plenty of body Mən tünd şərab xoşlayıram;* 8. bir yığın, bir aləm; **a ~ of information** bir aləm/bir yığın məlumat; *The oceans are large bodies of water Okeanlar bir aləm sudan ibarətdir;* 9. heyət; *The House of Commons is an elected body Nümayəndələr Palatası seçilmiş heyətdən ibarətdir;* 10. gövdə, çanaq *(maşında, gəmidə və s.)*; **the ~ of a car** maşının gövdəsi; 11. korpus; **diplomatic ~** diplomatik korpus; 12. orqan, şura, hakimiyyət; **governing ~** inzibati şura/sovet; **legislative/ executive ~** qanunverici / icraedici orqan / hakimiyyət;
◊ **to keep ~ and soul together** çətin/bir təhər dolanmaq, güclə yaşamaq/dolanmaq; **in a ~** tam heyətdə, bütövlükdə
**body blow** ['bɔdı'blou] *n id.* 1. yasaq/qadağan edilmiş zərbə *(boksda)*; 2. ağır zərbə
**body-colour** ['bɔdı.kʌlə^r] *n* ət rəngi
**bodyguard** ['bɔdıga:d] *n* cangüdən; *The President's bodyguard is/are waiting in the hall Prezidentin cangüdənləri zalda gözləyirlər*
**body-snatcher** ['bɔdı.snætʃə^r] *n* meyit oğurlayan *(keçmiş zamanlarda qəbirdən meyiti çıxarıb elmi tədqiqat aparmaq üçün həkimlərə satan adam)*
**body-type** ['bɔdıtaıp] *n poliqr.* əsas mətnin yığıldığı şrift
**bodywork** ['bɔdıwə:k] *n* korpusda aparılan iş *(gəminin, maşının təmiri zamanı)*
**boffin** ['bɔfın] *n d.d.* alim, mütəxəssis-məsləhətçi
**boffinary** [bɔfınərı] *n* alimlik; oxumuşluq
**bog**[1] [bɔg] *n* 1. bataqlıq; **the ~s of Ireland** İrlandiya bataqlıqları; 2. ayaqyolu
**bog**[2] [bɔg] *adj* **(-gg- ; -er, -est)** cəsarətli, qoçaq, ötkəm, məğrur; *He is a bog fellow O, cəsarətli / qoçaq / ötkəm oğlandır*
**bog**[3] [bɔg] *v* **(-gg-)** 1. batmaq, batıb/ilişib qalmaq; *The car bogged down in the mud Maşın palçığa / palçıqda batıb qaldı; The bill can bog down in Congress Qanun layihəsi Konqresdə ilişib qala bilər;* 2. fəaliyyətsiz olmaq; 3. pozmaq, qarşısını almaq; **to ~ down an attack** hücumun qarşı-



sını almaq; *The attack was bogged down Hücumun qarşısı alındı*
**bog-berry** ['bɔg.berı] *n bot.* mərcanı, quşüzümü
**boggle**[1] ['bɔgl] *n* 1. qorxu, hürkü *(əsas. at haq.)*; 2. qarma-qarışıqlıq, pis görülmüş iş; *What a boggle he did make of it! O, aləmi qatıb qarışdırdı! They got into that boggle in their expedition Onlar ekspedisiya zamanı bəlaya düşmüşlər;* 3. tərəddüd, şübhə; **to make ~** tərəddüd etmək / göstərmək
**boggle**[2] ['bɔgl] *v* 1. qorxmaq, hürkmək; 2. dartılmaq, çəkilmək; 3. **(at, about, over)** tərəddüd etmək, şübhələnmək; dayanmaq, durmaq; 4. **(at, over)** bir işi yöndəmsiz görmək; xarab etmək; **to ~ at a lock** qıfılı aça bilməmək / xarab etmək; 5. oyunda riskə getmək, risk etmək; 6. hiylə etmək, kələk gəlmək, biclik etmək
**boggy**[1] ['bɔgı] *n tib.* ishal *(uşaqlarda)*
**boggy**[2] ['bɔgı] *adj* 1. bataqlı; **~ hollows** bataqlı çökəklər; 2. zəif, süst, solğun; **~ flesh** zəif bədən
**bog-house** ['bɔghaus] *n* ayaqyolu
**bog-trot** ['bɔgtrɔt] *v* 1. bataqlıqda yaşamaq; 2. bataqlıqla getmək / yerimək
**bog-trotter** ['bɔg.trɔtə^r] *n* 1. bataqlıqda yaşayan; 2. irlandiyalı
**bogus**[1] ['bougəs] *n amer.* saxta pul kəsmək üçün maşın
**bogus**[2] ['bougəs] *adj* 1. saxta, qəlp, qondarma, süni; **~ affair** qondarma iş/sövdə; **~ prisoner** yalançı dustaq; 2. xəbərçi, xəbərverən
**bogy** ['bougı] *n* 1. cin, damdabaca; qarabasma, kabus; 2. uyuq, qorxuluq, qorxu yaradan/doğuran hər bir şey; 3. mülkədar; 4. *d.d.* polis *(nəfəri)*; 5. xəfiyyə; xəbərçi, xəbərverən
**bohemian**[1] [bou'hi:mjən] *n top.i* 1. bohema *(sərsəri həyat keçirən ziyalılar, onların həyat tərzi)*; 2. qaraçı
**bohemian**[2] [bou'hı:mjən] *adj* 1. bohema; **~ life** bohema *(sərgərdan)* həyat; *Many writers, artists, and musicians are thought to lead bohemian lives Belə deyirlər ki, çox yazarlar, artistlər və musiqiçilər bohema (sərgərdan) həyat keçirirlər;* 2. bohema; **~ glass** bohema şüşəsi
**boil**[1] [bɔıl] *n* I 1. qaynama; **to bring to the ~** qaynatmaq, qaynama dərəcəsinə çatdırmaq; **to come to the ~** qaynamaq; **to keep on/at the ~** qaynama halında saxlamaq; 2. *məc.* həyəcan; 3. qaynayan maye; 4. *amer.* su burulğanı *(suyun üzündə)*
**boil** [bɔıl] *n* II 1. *tib.* çiban; 2. qabarcıq *(rənglənmiş səthdə)*; *The paint swelled into boils Boya qabarcıqlandı*
**boil**[2] [bɔıl] *v* 1. qaynatmaq, bişirmək; **to ~ potatoes** kartof bişirmək / qaynatmaq; **to ~ clothes** paltar qaynatmaq; 2. qaynamaq; bişmək; 3. coşmaq, həyəcana gəlmək; **to make *smb.'s* blood ~** bir kəsi hiddətləndirmək/cin atına mindirmək; 4. hirslənmək, əsəbiləşmək; 5. sudan atılmaq *(balıq haq.)*; **to ~ away** qaynayıb çəkilmək, suyu çəkilmək, qaynayıb buxar olmaq; **to ~ over** 1) qaynayıb daşmaq; 2) nifrətdən coşmaq;
◊ **to ~ the pot, to make the pot ~, to keep the pot ~ing** qazan qaynatmaq; bir tikə çörək qazanmaq, xaltura vasitəsi ilə pul qazanmaq
**boiled** [bɔıld] *adj* 1. bişmiş, qaynadılmış; **~ egg** qaynadılmış/ bişirilmiş yumurta; **soft ~ egg** boş bişirilmiş yumurta; **hard ~ egg** bərk bişirilmiş yumurta; 2. *amer.* kefli, sərxoş;
◊ **~ shirt** 1) kraxmallanmış köynək; 2) zabitəli/ lovğa / təkəbbürlü adam; **to feel like a ~ rag** yorğun/üzgün olmaq, əzilmiş pomidor kimi olmaq
**boiler** ['bɔılə^r] *n* 1. buxar qazanı; 2. *tex.* retora *(distillə cihazı)*; 3. qaynadan *(cihaz)*; 4. paltar qaynatmaq üçün bak; 5. bişirən; **a soap ~** sabun bişirən
**boiler-house** ['bɔıləhaus] *n* qazanxana
**boiler-room** ['bɔılərum] *n* qazanxana; ocaqxana
**boiling**[1] ['bɔılıŋ] *n* 1. qaynama; 2. qaynatma
**boiling**[2] ['bɔılıŋ] *adj* 1. qaynayan; qaynar, coşan, coşğun, təlatümlü; dalğalanan; **~ sun** qaynar günəş; **~ water** coşan/təlatümlü su; **~ waves** coşğun /təlatümlü dalğalar; **~ with anger** acıqdan coşan; 2. qaynama; **~ point** qaynama nöqtəsi; **~ temperature** qaynama temperaturu; *Water and oil have different boiling point Suyun və yağın müxtəlif qaynama nöqtəsi var;* 3. qızmar; **~ weather** qızmar hava
**boisterous** ['bɔıstərəs] *adj* 1. coşğun, qeyzli, hiddətli, qudurğan; 2. boranlı, tufanlı, şiddətli, kəskin; 3. səsli-küylü, gurultulu
**boisterously** ['bɔıstərəslı] *adv* 1. coşğunluqla, qeyzlə, hiddətlə; 2. kəskin, şiddətlə; 3. səslə-küylə, gurultu ilə
**boisterousness** ['bɔıstərəsnıs] *n* 1. coşğunluq, qeyzlilik, qudurğanlıq; 2. kəskinlik, şiddətlilik; 3. səs-küylülük, səs-küy, gurultu
**bold** [bould] *adj* 1. cəsur, qoçaq, qorxmaz, cəsarətli; **~ thinker** cəsarətli mütəfəkkir; **~ speech** cəsarətli nitq; **~ man** cəsur / qoçaq adam; **a very ~ action** çox cəsarətli hərəkət; 2. utanmaz, həyasız, ədəbsiz, qaba, kobud; **a ~ girl** utanmaz/həyasız/ədəbsiz qız; 3. özündən bədgüman, lovğa, özünə qürrələnən; 4. açıq, aydın *(xətt haq.)*; 5. güclü, qüvvətli; **~ flames** güclü / qüvvətli alov;
◊ **to be so ~ as, to make so ~** cəsarət/ cürət / ürək etmək; *I'll be bold to say Deməyə cəsarət / cürət edərəm;* **to put a ~ face on the matter** özünü cəsarətli / igid göstərmək
**bolden** ['bouldən] *v* 1. ürəkləndirmək, ürək vermək, cürətləndirmək, cəsarətləndirmək; 2. qərar vermək, qərara gəlmək
**bold-face** ['bouldfeıs] *n* 1. sırtıq, utanmaz, abırsız, həyasız, ədəbsiz; 2. *poliqr.* qara şrift / hərf
**bold-faced** ['bouldfeıst] *adj* 1. sırtıq, abırsız, həyasız, utanmaz, ədəbsiz; 2. *poliqr.* qara; **~ type** qara şrift / hərf

**boldliness** ['bouldlınıs] *n* 1. sırtıqlıq, abırsızlıq, həyasızlıq, ədəbsizlik; 2. kəskinlik, sərtlik
**boldly** ['bouldlı] *adv* 1. cürətlə, cəsarətlə; **to go at it** ~ işə cürətlə/cəsarətlə girişmək; **to paint** ~ cürətlə/cəsarətlə çəkmək *(rəssam haq.)*; 2. həyasızcasına, həyasız-həyasız, sırtıq-sırtıq, sırtıqcasına; 3. kəskin, sərt/ kəskin surətdə; *The coast rises boldly Sahil kəskin surətdə dikəlir / yüksəlir*
**bole** [boul] *n* gövdə *(bitkilərdə)*
**bolero** [bə'leərou] *n* I *mus.* bolero *(ispan rəqsi və bu rəqs üçün musiqi)*
**bolero** [bə'leərou] *n* II qısa qadın gödəkçəsi *(qollu və ya qolsuz)*
**bolide** ['boulaıd] *n astr.* bolid; meteor
**Bolivian**[1] [bə'lıvıən] *n* boliviyalı
**Bolivian**[2] [bəlıvıən] *adj* Boliviya; ~ **music** Boliviya musiqisi
**boll** [boul] *n bot.* qoza *(pambıqda)*
**boll breaker** ['boul,breıkər] *n* pambıqyığan maşın *(açılmamış qozalar yığan)*
**Boloney** [bəlouni] *n* cəfəngiyyat, laqqırtı; *Don't talk boloney! Cəfəngiyyat danışma/danışmayın!*
**Bolshevik**[1] ['bɔlʃıvık] *n tar.* bolşevik
**Bolshevik**[2] ['bɔlʃıvık] *adj tar.* bolşevik
**Bolshevism** ['bɔlʃıvızm] *n* bolşevizm
**Bolshevist** ['bɔlʃıvıst] *n* bolşevik
**bolster**[1] ['boulstər] *n* 1. mütəkkə, yastıq; 2. bufer *(parovoz, vaqon və s.-də təkanın gücünü azaltmaq üçün yaylı mexanizm)*
**bolster**[2] ['boulstər] *v* 1. mütəkkəyə dirsəklənmək; 2. *(həm də* **to** ~ **up)** müdafiə etmək, tərəfdar olmaq; möhkəmlətmək, bərkitmək; **to** ~ *smb.'s* **courage** bir kəsin qoçaqlığını bəyənmək; **to** ~ **(up) a theory with** *one's* **authority** öz nüfuzu ilə nəzəriyyəni müdafiə etmək; **to** ~ **superstition and prejudice** mövhumatın və xurafatın kökünü kəsməyə kömək/yardım etmək; 4. qızışdırmaq, təhrik etmək, fitləmək, fitva vermək; 5. *hərb.* kömək/müdafiə etmək; gücləndirmək; 6. mütəkkə / yastıq ilə vuruşmaq *(məktəb jarqonu)*
**bolt**[1] [boult] *n* I 1. rəzə, siyirmə, sürgü; qıfılın dili; **behind** ~ **and bar** qıfıl altında, barmaqlıq arxasında; 2. bolt; 3. qaçma, qaçaqaç, sürətlə geri çəkilmə; **to make/to do a** ~ **for it** bərk qaçmaq; yüyürmək; bərk çapmaq *(atı)*; atılmaq, hücum etmək, şığımaq; *His horse made a bolt Onun atı şığıdı / bərk qaçdı;* 4. *amer.* öz partiyasından/prinsipindən və s. üz döndərmək; **to make a** ~ **to another party** başqa partiyaya keçmək; 5. ildırım, ildırım zərbəsi; 6. rulon *(lülə şəklində bükülmüş kağız, müşəmbə və s.)*;
◊ **to go off like a** ~ ox kimi qaçıb getmək; **a** ~ **from the blue** birdən-birə, heç gözlənilmədən; *His sudden death came as / like a bolt from the blue Onun ölümü heç gözlənilmədən baş verdi, O gözldənilmədən vəfat etdi / öldü*

**bolt** [boult] *n* II ələk; şadara
**bolt**[2] [boult] *v* 1. rəzə ilə bağlamaq; **to** ~ *smb.* **in** bir kəsi dama salıb bağlamaq; 2. boltla bağlamaq/bərkitmək; 3. ox atmaq; 4. irəli cummaq /atılmaq; 5. qaçmaq, qaçıb getmək; 6. baş aparmaq **(at)**; 7. öz partiyasından çıxmaq/uzaqlaşmaq, öz partiyasının nümayəndəsini seçkidə müdafiə etməmək; 8. çox iti yemək, çeynəmədən yeməyi udmaq; **to** ~ *one's* **dinner** naharı tələsik çeynəmədən yemək; 9. lülələmək, bürmələmək
**bolt** [boult] *v* II 1. ələmək, ələkdən/şadaradan keçirmək; seçmək; 2. *məc.* diqqətlə nəzərdən keçirmək, diqqətlə tədqiq etmək
**bolter** ['boultər] *n* I 1. qaçaq, qaçqın; 2. tərs/inad /harın at; 3. *amer.* fərari, düşmən tərəfinə keçən adam; xain, satqın
**bolter** ['boultər] *n* II ələk; xəlbir; şadara
**bolt-head** ['boulthed] *n* boltun başı
**bolt-hole** ['boulthoul] *n* 1. bolt yeri/deşiyi; 2. yeraltı sığınacaq; 3. ehtiyat çıxış
**bomb**[1] [bɔm] *n* bomba; **air** ~ aviasiya bombası; **flying / winged** ~ uçan/qanadlı mərmi; **to drop a** ~ bomba tökmək; **to go like a** ~ 1) bərk getmək; *My new car goes like a bomb Mənim təzə maşınım bomba kimi gedir (yəni sürətlə gedir);* 2) müvəffəqiyyətlə keçmə; *The party went like a bomb Qonaqlıq bomba kimi keçdi;*
◊ **to throw a** ~ sensasiya yaratmaq, vəlvələ salmaq
**bomb**[2] [bɔm] *v* 1. bombalamaq, bomba salmaq/atmaq; 2. qumbara atmaq, əl bombası atmaq; **to** ~ **up** bomba ilə yükləmək *(təyyarəni )*
**bomb-aimer** ['bɔm,eımər] *n av.* bombardir, bomba tuşlayan *(hədəfə)*
**bombard** ['bɔmba:d] *v* 1. bombardman etmək, bombalamaq, topa tutmaq; 2. *məc.* suala tutmaq / basmaq; *The speaker was bombarded with questions Natiqə sual yağdırdılar*
**bombardier** [,bɔmbə'dıər] *n* bombardir; topçu
**bombardment** [bɔm'ba:dmənt] *n* bombardman, bombalama; topa tutma
**bombast**[1] ['bɔmbæst] *n* təmtəraqlılıq, ibarəlilik; qəlizlik
**bombast**[2] ['bɔmbæst] *adj* = **bombastic**
**bombastic** [bɔm'bæstık] *adj* təmtəraqlı, ibarəli, məğrur, təşəxxüslü; **a** ~ **speech** təmtəraqlı/ibarəli nitq; **a** ~ **person** təşəxxüslü / hay-küylü adam
**bombastically** [bɔm'bæstıkəlı] *adv* təmtəraqla, təşəxxüslə, məğrurluqla; **to speak** ~ təmtəraqla danışmaq
**bomber** ['bɔmər] *n hərb.* bombardmançı təyyarə
**bombing** ['bɔmıŋ] *n* 1. bombalama, bombardman; bombaatma; 2. əl qumbarası atma / tullama
**bombproof**[1] ['bɔmpru:f] *n* bomba sığınacağı, bombadan qorunmaq üçün xüsusi yer
**bombproof**[2] ['bɔmpru:f] *adj* bombayadavamlı; **a** ~ **shelter** bombayadavamlı sığınacaq



**bomb raid** ['bɔmreıd] *n hərb.* 1. bombardmançı təyyarələrin hücumu; 2. əl qumbarası ilə hücum
**bombshell** ['bɔmʃel] *n* 1. bomba; 2. əl qumbarası; 3. gözlənilməz pis/acı xəbər, gözlənilməz pis hadisə; *The news of the defeat was a bombshell Məğlubiyyət haqqındakı bəd xəbər bomba kimi partladı*
**bombsight** ['bɔmsaıt] *n* bombanı hədəfə nişanlayan / yönəldən cihaz *(təyyarədə)*
**bombsite** ['bɔmsaıt] *n* şəhərdə bombardman nəticəsində dağılmış yer
**bon** [bɔn] *adj fr.* yaxşı, iyi
**bona** ['bounə] *n pl* 1. daşınar və daşınmaz əmlak; 2. daşınar əmlak
**bona fide** ['bounə'faıdı] *adj lat.* 1. vicdanlı, insaflı, namuslu, düz, təmiz, səmimi; ~ **purchaser** vicdanlı/insaflı alıcı; ~ **competition** *id.* eyni şəraitə söykənən / eynişəraitli yarış; 2. əsl, həqiqi, xalis; **the** ~ **poor** əsl /həqiqi kasıblar; *Bona fide travellers may leave their cars at the station Həqiqi səyahətçilər maşınlarını dayanacaqda qoya bilərlər*
**bona fides** ['bounə'faıdız] *n pl lat.* 1. düzlük, vicdan, insaf, təmizlik, səmimiyyət, sədaqət; 2. xoş məram, yaxşı fikir
**bonanza** [bə'nænzə] *n* 1. *amer.* gəlirli / xeyirli müəssisə; *This company proved a bonanza Məlum oldu ki, bu kampaniya gəlirli müəssisədir;* 2. uğur, müvəffəqiyyət; 3. çiçəklənmə, tərəqqi /inkişaf etmə, tərəqqi, inkişaf; 4. bol/yaxşı məhsul; 5. iri / böyük mağaza
**Bonapartism** ['bounəpa:tızm] *n* bonapartizm
**Bonapartist** ['bounəpa:tıst] *n* bonapartist, bonapartizm tərəfdarı
**bon-bon** ['bɔnbɔn] *n* 1. *fr.* konfet; 2. *arx.* zərif şey
**bond**[1] [bɔnd] *n* I 1. borc iltizamı, borc qəbzi; ~ **of obligation** *hüq.* borc iltizamı; 2. girov; 3. zamin, zamin olan, zəmanətçi; **to stand** ~ **for** *smb.* bir kəsə zamin durmaq/olmaq; 4. öhdəçilik; təəhhüd; müqavilə, saziş; *His word is as good as his bond O, sözünün ağasıdır;* 5. *pl mal.* istiqraz, bon *(pul və s. almaq üçün kredit kağızı)*; **government** ~s dövlət istiqrazları; 6. əlaqə; ~**s of friendship** dostluq əlaqələri; 7. *pl* buxov, qandal; zəncir; həbsxana; **in** ~**s** həbsxanada; **to break** *one's* ~**s** buxovunu/qandalını sındırmaq; **to break from** *one's* ~**s** qandaldan / buxovdan azad olmaq
**bond** [bɔnd] *v* 1. borc iltizamını / qəbzini imzalamaq; girov müqaviləsi tərtib etmək; 2. əlavə girov qoymaq; 3. *mal.* istiqraz buraxmaq; 4. malı gömrükdə qoymaq *(gömrük haqqı veriləнə qədər)*
**bondage** ['bɔndıdʒ] *n* 1. quldarlıq; təhkimçilik; *Moses led the Israelites out of their bondage in Egypt Musa yəhudiləri Misirdə köləlikdən xilas etdi;* 2. asılılıq, köləlik, əsarət

**bondager** ['bɔndıdʒər] *n* muzdur qadın / qız, təhkimli qadın / qız
**bond-creditor** ['bɔnd,kredıtər] *n mal.* istiqraz vərəqəsi üzrə kreditor *(borcu olan)*
**bond-debt** ['bɔnd'det] *n mal.* istiqraz vərəqəsi üzrə borc
**bonded** ['bɔndıd] *adj* 1. *mal.* istiqraz vərəqəsi ilə ödənmiş *(borc haq.)*; 2. gömrük anbarında saxlanılan; ~ **goods** gömrük anbarında saxlanılan mallar; ~ **warehouse** gömrük haqqı verilməyən malların saxlanıldığı gömrük anbarı
**bondhold** ['bɔndhould] *n tar.* biyar; təhkimçilik asılılığı
**bondholder** ['bɔnd,houldər] *n* I istiqraz vərəqələri sahibi
**bondholder** ['bɔnd,houldər] *n* II *tar.* biyara gedən kəndli; təhkimli kəndli
**bondmaid** ['bɔndmeıd] *n* təhkimli qadın / qız; qul qadın / qız
**bondmaiden** ['bɔndmeıdn] *n* = **bondmaid**
**bondman** ['bɔndmən] *n (pl* **-men)** *tar.* təhkimli kəndli; qul
**bondslave** ['bɔndsleıv] *n* = **bondman**
**bondsman** ['bɔndzmən] *n (pl* **-men)** 1. zamin, zəmanətçi, zamin olan; 2. təhkimli kəndli; qul
**bone**[1] [boun] *n* 1. sümük; *He broke a bone in his leg O, ayağının bir sümüyünü sındırdı;* 2. skelet; əsas, özək; 3. *pl* cənazə, meyit; kül *(yandırılmış meyitdən qalan)*; *His bones were laid in Westminister Onun meyiti Vestminister Abbatlığında basdırıldı;* 4. aşıq *(oyun üçün sümük)*; domino *(oyun və bu oyunun daşları)*; 5. kastanyet *(barmağa taxılaraq rəqs edərkən musiqi taktına uyğun şaqqıldadılan şaxşax)*; 6. krujeva mili *(krujeva hörmək üçün iynə)*; 7. *pl.* zövq, kef, ləzzət; *Now, that's what I call bones Bax, mən buna kef deyirəm;*
◊ **hard /dry as a** ~ sümük kimi bərk/ quru; **to the** ~ sümüyə qədər/kimi; **drenched to the** ~ sümüyə qədər islanmış; **frozen to the** ~ sümüyə / iliyə qədər donmuş *(bərk üşümüş)*; **a bag of** ~**s** bir dəri, bir sümük *(yəni çox arıq)*; **to cast a** ~ düşmənçilik / ədavət / nifaq salmaq; ~ **of contention/discord** ədavət / nifaq / düşmənçilik salan şey; **to have a** ~ **to pick with** *smb.* bir kəslə haqq-hesab çəkmək / çürütmək; *The nearer the bone the sweeter the flesh at söz.* ≅ *Sümüyə yaxın ət dadlı olar, Qalıq dadlı olar; What is bread in the bone will not go out of the flesh* ≅ *Qozbeli qəbir də düzəltməz*
**bone**[2] [boun] *v* 1. əti sümükdən çıxarmaq, ətin sümüyünü çıxartmaq; *Will you bone this piece of meat for me? Bu ət parçasının sümüyünü mənim üçün çıxardarsanmı?/çıxardarsınızmı?;* 2. sümük unu ilə münbitləşdirmək *(torpağı)*, yerə sümük gübrəsi səpmək/vermək
**bone-ash** ['bounæʃ] *n* sümük külü
**boned** [bound] *adj* sümükdən təmizlənmiş / çıxa-

rılmış, sümüyü çıxarılmış; ~ **meat** sümüyü çıxardılmış / sümüksüz ət

**bone-dry** ['boundraı] *adj* sümük kimi quru, tam quru, qupquru

**bone-dust** ['boundʌst] *n* = **bone-meal**

**bone-head** ['bounhed] *n amer. jarq.* axmaq, kütbeyin *(adam)*, küt, korazehin, qanmaz

**bone-headed** ['bounhedıd] *adj* axmaq, gic, qanmaz, küt, korazehin

**bone-idle** [ˌboun'aıdl] *adj* lap/həddən artıq tənbəl

**boneless** ['bounlıs] *adj* **1.** sümüksüz, sümükdən çıxarılmış; **2.** onurğasız; **3.** *məc.* zəif, iradəsiz, xaraktersiz

**bone marrow** ['bounˌmærou] *n* ilik

**bone-meal** ['bounmi:l] *n* sümük unu *(gübrə)*

**boner** ['bounəʳ] *n amer. jarq.* səhv, kobud səhv

**bone-setter** ['bounˌsetəʳ] *n* sınıqçı

**bone-shaker** ['bounˌʃeıkəʳ] *n* **1.** köhnə əyri-üyrü velosiped; **2.** köhnə sınıq-salxaq maşın

**bon-fire** ['bɔnˌfaıəʳ] *n* tonqal *(xüs. müəyyən bayramla əlaqədar yandırılan)*; **to make ~s** tonqal qalamaq; **to make a ~ of** *smth.* bir şeyi yandırmaq/yandırıb məhv etmək

**bongrace** ['bɔŋgreıs] *n* qıraqları enli qədim qadın şlyapası

**Boniface** ['bɔnıfeıs] *n* aşxanaçı, meyxanaçı, aşxana sahibi *(xüs. xoşsifət)*

**bonnet** ['bɔnıt] *n* **1.** kənarı olmayan qadın şlyapası; **2.** kapor *(çənə altından bağlanan qadın və ya uşaq papağı)*; **3.** beret; **4.** ləlşkdən hazırlanmış baş geyimi *(amerikan hindularının geyimi)*; **5.** hiyləbazın köməkçisi, hiyləbazla əlbir olan adam; kələkbazın yoldaşı;

◊ **to fill** *smb.'s* **~ 1)** bir kəsin yerini tutmaq; **2)** hər barədə bir kəsə tay olmaq

**bonny** ['bɔnı] *adj dial.* **1.** gözəl və sağlam; **a ~ baby** gözəl və sağlam uşaq; **2.** bacarıqlı; **a ~ fighter** bacarıqlı mübariz

**bonus** ['bounəs] *n* mükafat; tantyem *(qazancın bir hissəsindən bank və sənaye müəssisələrinə verilən əlavə mükafat)*

**bony** ['bounı] *adj* **1.** sümük; sümüyü çıxmış; **her ~ hands** onun sümüyü çıxmış əlləri; **2.** sümüklü; **~ fish** sümüklü balıq; **a ~ man** sümüklü adam/kişi

**bony-cotton** ['bounı'kɔtn] *n* uzunlifli pambıq

**boo¹** [bu:] *n* **1.** fitə/küyə basmaq, narazılıq bildirmək; **2.** qovmaq; **to ~ a dog** iti qovmaq

**boo²** [bu:] *inter.* tfu! uf! *(nifrət, ikrah, narazılıq bildirən nida)*

**booby** ['bu:bı] *n* **1.** gic, axmaq, korazehin, qanmaz; sarsaq, səfeh; **2.** ən pis şagird; **3.** *id.* finiş xəttinə ən axırıncı gələn, ən az xal toplayan *(idmançı)*;

◊ **to beat the ~ 1)** qızınmaq üçün əllərini biribirinə vurmaq; **2)** axırıncı gəlmək *(yarışda)*

**booby hatch** ['bu:bıhætʃ] *n* dəlilər üçün xəstəxana

**booby-prize** ['bu:bıpraız] *n* zarafat olaraq finişə axırıncı gələnə verilən priz/mükafat

**booby-trap¹** ['bu:bıtræp] *n* **1.** tələ *(zarafat üçün qurulmuş)*; **2.** *hərb.* tələ-mina

**booby-trap²** ['bu:bıtræp] *v* tələ qurmaq

**boodle** ['bu:dl] *n* I *jarq.* **1.** saxta pul; **2.** rüşvət; **3.** rüşvət alan; **4.** siyasi lideri ələ almaq / öz tərəfinə çəkmək üçün pul; **4.** kapital, çox pul *(xüs. əyri yollarla əldə edilmiş)*; **5.** *amer.* dəstə, camaat, izdiham, yığnaq, yığıncaq, mərəkə

**boodle** ['bu:dl] *n* II *d.d.* axmaq, gic, sarsaq, korazehin

**boohoo¹** [ˌbu:'hu:] *n* **1.** hıçqırtı, hönkürtü; hönkür-hönkür ağlama; **2.** ucadan gülmə, qəhqəhə, qəhqəhə çəkmə

**boohoo²** [ˌbu:'hu:] *v* **1.** hönkür-hönkür ağlamaq, hönkürmək; **2.** qəhqəhə ilə gülmək, qəhqəhə çəkmək

**book¹** [buk] *n* **1.** kitab; **picture ~** şəkil kitabı; **2.** **the Book** Bibliya *(tövrat və incil)*; **to swear on the Bible** Bibliyaya and içmək; **3.** cizgilənmiş və ya ağ kağızların bir yerdə tikilməsi; **an account ~** buxalter kitabı; **a ~ of stamps** marka albomu; **4.** libretto *(musiqi əsərinə yazılan mətn)*; *The music was fine but the book was very poor Musiqi əla idi, lakin libretto zəif idi;* **5.** məşğələ, məşğul olma; **to be at one's ~s** məşğul olmaq, dərs hazırlamaq;

◊ **a ~ of fate** tale kitabı; **a ~ of life** həyat kitabı; **a ~ of God** bibliya; **to take** *smb.'s* **name off the ~s** bir kəsin adını siyahıdan çıxartmaq; **to close the ~s 1)** işi müvəqqəti olaraq dayandırmaq; **2)** nəticə vurmaq, yekunlaşdırmaq; **to shut the ~s** işi bağlamaq, işə xitam vermək; **to speak / to talk like the ~** inamla danışmaq, fikrini dəqiq ifadə etmək; **a closed ~ (to)** örtülü kitab, haqqında az məlumata malik olan məsələ; *Politics is a closed book to me, so don't ask me questions about it Siyasət mənim üçün örtülü kitabdır, bu barədə mənə sual vermə/verməyin*

**book²** [buk] *v* **1.** kitaba yazmaq/qeyd etmək; registrasiya etmək *(sifarişi və s.)*; *He booked all names O, bütün adları kitaba yazdı / qeyd etdi;* **2.** əvvəlcədən sifariş etmək *(mehmanxanada otaq, bilet və s.)*; **to ~ seats for a performance** tamaşa üçün bilet almaq; *All seats are booked Bütün yerlər (biletlər) satılıb;* **3.** sifariş qəbul etmək; *We are heavily booked Bizə çoxlu sifariş veriblər;* **4.** çağırmaq, dəvət etmək *(aktyoru, mühazirəçini və s.)*; **5.** *d.d.* dəvət etmək; *I want to book you to dinner Mən səni/sizi nahara dəvət etmək istəyirəm;* **6.** razılaşmaq; razılığa gəlmək; *I am booked to go to London next week Mən gələn həftə Londona getməyə razıyam;* **7.** *məktəbli jarqonu;* başa düşmək, anlamaq; *I booked at once Mən dərhal məsələnin nə yerdə olduğunu anladım/başa düşdüm;* **to ~ in** işə gələrkən tabelə qol çəkmək; **to ~ through** tranzit bileti almaq



**bookbinder** ['bukˌbaındəʳ] *n* cildçi

**bookbindery** ['bukˌbaındərı] *n* **1.** cildxana, cildçi emalatxanası; **2.** cildləmə sənəti

**bookbinding** ['bukˌbaındıŋ] *n* cildçilik, cildçilik işi / sənəti

**bookcase** ['bukkeıs] *n* kitab şkafı, kitab rəfi

**book-club** ['bukklʌb] *n* kitabsevərlər klubu; öz üzvlərinə ucuz qiymətə kitab satan klub

**booked** [bukt] *adj* **1.** qeyd olunmuş, siyahıya alınmış; **2.** sifariş edilmiş/olunmuş; **3.** təsis/bərqərar edilmiş, qanuna salınmış; müntəzəm; *Certain booked trains will be discontinued Qrafiklə müntəzəm gələn bəzi qatarlar ləğv ediləcək;* **the recognized and ~ principles** hamı tərəfdən qəbul edilmiş və bərqərar olmuş prinsiplər; **4.** qanun-qaydanı pozmaqda ittiham olunan

**book-ends** ['bukendz] *n* kitabaltı

**booker** ['bukəʳ] *n* mühasib, hesabdar, buxalter

**book-holder** ['bukˌhouldəʳ] *n* kitabaltı, kitabı saxlamaq üçün dayaq / altlıq

**book-hunter** ['bukˌhʌntəʳ] *n* nadir kitablar toplayan

**booking** ['bukıŋ] *n* **1.** sifarişi kitaba salan / yazan; **2.** biletlərin satışı; **3.** filmi prokata götürmək üçün kontrakt bağlama

**booking-clerk** ['bukıŋkla:k] *n* kassir *(bilet / teatr kassasında işləyən)*

**booking-office** ['bukıŋˌɔfıs] *n* bilet kassası

**bookish** ['bukıʃ] *adj* **1.** kitab; **a ~ way of speaking** kitab dilində danışıq tərzi; **~ words** kitab dilində işlənən sözlər; **2.** həyatı kitablardan öyrənən; **3.** pedant, xırdaçı, vasvası

**book-keeper** ['bukˌkı:pəʳ] *n* buxalter, hesabdar

**book-keeping** ['bukˌki:pıŋ] *n* buxalteriya, mühasibat; hesabdarlıq

**book-learning** ['bukˌlə:nıŋ] *n* kitab biliyi; həyatdan uzaqlıq, həyatdan uzaq olma

**bookless** ['buklıs] *adj* **1.** kitabsız; **2.** *şair.* savadsız, oxumamış, təhsilsiz, cahil

**booklet** ['buklıt] *n* buklet, kitabça

**book-maker** ['bukˌmeıkəʳ] *n* **1.** kompilyator, kompilyasiyaçı, kompilyasiya ilə məşğul olan adam *(müstəqil tədqiqat aparmadan, başqalarının əsərlərindən istifadə yolu ilə kitab yazan adam)*; **2.** = **book-mark**

**bookman** ['bukmən] *n (pl* **-men***)* **1.** alim; **2.** nəşriyyatçı, kitab nəşriyyatçısı; **3.** kitabsatan

**bookmark** ['bukma:k] *n* əlfəcin, nişan *(kitabın arasına qoymaq üçün)*

**bookmobile** ['bukˌmoubaıl] *n* səyyar kitabxana *(yük maşınında)*

**book-oath** ['bukouθ] *n* bibliyaya and içmə

**book-post** ['bukpoust] *n* kitab göndərmək üçün poçt şöbəsi

**book-postage** ['bukˌpoustıdʒ] *n* kitab göndərmək üçün poçt xərcləri

**book-read** ['bukred] *adj* bilikli; məlumatlı, çox oxumuş, çox mütaliə etmiş

**book-rest** ['bukrest] *n* pyupitr *(üzərinə not və ya kitab qoymaq üçün maili lövhəsi olan ştativ)*

**bookseller** ['bukˌseləʳ] *n* kitab satan

**bookselling** ['bukˌselıŋ] *n* kitab ticarəti

**book-shelf** ['bukʃelf] *n (pl* **-shelves***)* kitab rəfi

**book-shop** ['bukʃɔp] *n* kitab mağazası

**book-stall** ['bukstɔ:l] *n* kitab köşkü /kiosku

**book-stand** ['bukstænd] *n* **1.** = **book-stall**; **2.** kitab stendi / sərgisi

**bookstore** ['bukstɔ:ʳ] *n amer.* kitab mağazası

**bookways** ['bukweız] *adv* kitab formasında / şəklində

**book-wise** ['bukwaız] *adj* alim, oxumuş, savadlı

**bookwork** ['bukwə:k] *n* kitab üzərində iş; *He's not good at bookwork, but he likes working with his hands Onun kitab oxumaqla işi yoxdur, lakin fiziki işdən xoşu gəlir*

**bookworm** ['bukwə:m] *n* **1.** kitab qurdu; **2.** hərfgüdən, hərfxor, pedant

**boom¹** [bu:m] *n* I **1.** uğultu, gumbultu, gurultu; *(atəşin, ildırımın və s. səsi)*; **the loud ~ of a gun** top atəşinin bərk gurultusu; **the dull ~ of disturbed sea** təlatümlü dənizin boğuq gurultusu /uğultusu; **2.** vızıldama, vızıltı; **the ~ of beetles** böcəklərin vızıltısı / vızıldaması

**boom** [bu:m] *n* II **1.** canlanma, sürətli yüksəliş; *The great boom in building set in Tikintidə sürətli yüksəliş başladı;* **2.** səs-küy, hay-küy, gurultu; səs-küylü reklam, ajiotaj; *A boom was worked up before the arrival of the singer Həla müğənni gəlməzdən əvvəl hay-küy qaldırılmışdı*

**boom²** [bu:m] *v* I **1.** sürətlə inkişaf etmək / qalxmaq *(qiymət, tələb və s.)*; *The trade is booming Ticarət sürətlə inkişaf edir; The stocks may boom today and drop tomorrow Səhmlər bu gün qalxa və sabah düşə bilər; His books are booming Onun kitablarına böyük tələbat var;* **2.** səs-küy/hay-haray qaldırmaq, reklam etmək; *The book had been boomed beforehand Kitab haqqında əvvəlcədən reklam edilmişdi*

**boom** [bu:m] *v* II **1.** uğuldamaq, guruldamaq, vızıldamaq; *The guns boomed Toplar guruldadı;* **2.** sürətlə inkişaf etmək / canlanmaq; *Business is booming these days Biznes bu günlərdə sürətlə canlanır / inkişaf edir*

**boomer** ['bu:məʳ] *n amer.* **1.** *jarq.* səs-küyçü, səs-küy salan; **2.** *jarq.* təşviqatçı

**boomerang¹** ['bu:məræŋ] *n* bumeranq *(Avstraliyada yerli əhalinin quş və bəzi heyvanları ovlamaq üçün işlətdikləri elastik silah)*

**boomerang²** ['bu:məræŋ] *v* bumeranq kimi hərəkət etmək *(yəni əks təsir göstərmək, özünə qarşı çevrilmək)*; *His argument boomeranged Onun dəlili özünə qarşı çevrildi*

**booming** ['bu:mıŋ] *n* **1.** uğultu, uğuldama; gurultu; **2.** vızıltı, vızıldama

**boon¹** [bu:n] *n* **1.** kömək; rahatlıq; xoşbəxtlik; *The radio is a great boon for the blind Radio*

*korlar üçün böyük kömәkdir / nemәtdir; Parks are a great boon to people in big cities Parklar böyük şәhәrlәrdә adamlar üçün böyük rahatlıqdır;* 2. *arx.* xahiş, tәvәqqe, yaxşılıq; **to ask a ~ of someone** bir kәsdәn yaxşılıq tәvәqqe etmәk

**boon²** [bu:n] *adj* 1. xeyirxah; mehriban, gülәrüzlü, üzügülәr, xoşrәftar; şәn; ~ **companion** xeyirxah / mehriban /gülәrüz dost; 2. *arx.* sәxavәtli, bol *(tәbiәt haq.)*; yaxşı tәsir edәn, xoşagәlәn *(iqlim haq.)*

**boor** [bɔ:ʳ] *n* 1. kobud/tәrbiyәsiz/qaba adam; 2. *arx.* kәndli, cahil adam, kәndli-kütlü

**boorish** [ˈbuәrɪʃ] *adj* cahil, kobud, qaba, tәrbiyәsiz

**boorishly** [ˈbuәrɪʃlɪ] *adv* kobudcasına, qabacasına, cahilcәsinә, tәrbiyәsizcәsinә, tәrbiyәsiz / kobud / qaba bir tәrzdә

**boorishness** [ˈbuәrɪʃnɪs] *n* kobudluq, qabalıq, cahillik, tәrbiyәsizlik

**boost¹** [bu:st] *n* 1. ürәk vermә, ruhlandırma; kömәk, arxa, yardım; itәlәmә, hәrәkәt vermә; kömәk etmә; **to give** *smb.* **a** ~ bir kәsә kömәk etmәk; 2. artma, yüksәlmә *(qiymәt haq.)*

**boost²** [bu:st] *v* 1. altdan qaldırmaq, kömәk etmәk; *If you boost me up, I can just reach the window Sәn / Siz mәni altdan qaldırsan / qaldırsanız, mәn pәncәrәyә çataram;* 2. qaldırmaq, çoxaltmaq, artırmaq; **to ~ prices** qiymәtlәri qaldırmaq; **to ~ production** istehsalı artırmaq; 3. reklam vasitәsilә elan etmәk, reklam vermәk; hәddәn artıq tәriflәmәk; *He is always boosting his home town O hәmişә doğma şәhәrini tәriflәyir;* 4. *fiz.* tәzyiqi artırmaq, gәrginliyi artırmaq *(su, cәrәyan haq)*; 5. *id.* alıb ötürmәk *(topu)*

**booster** [ˈbu:stәʳ] *n* 1. qızğın tәrәfdar / tәrәfkeş, alovlu müdafiәçi; **a great ~ of *one's* country** öz vәtәninin alovlu müdafiәçisi, öz vәtәninin qızğın vәtәnpәrvәri; 2. tәkan verәn, tәkanverici, kömәk edәn *(adam)*; 3. *jarq.* dükan oğrusu

**booster fuel** [ˈbu:stәˈfjuәl] *n* raket daşıyıcısının yanacağı

**boot¹** [bu:t] *n* 1. botinka, çәkmә; **high / riding ~** uzunboğaz çәkmә; 2. *pl id.* buts *(futbol oyunu üçün xüsusi ayaqqabı)*; **nailed ~s** alpinistlәr üçün ayaqqabı; 3. minik maşınının yük yeri; 4. botinka/çәkmә ilә vurulan zәrbә; tәpik; *He jumped out from the bushes, gave a boot in my stomach, and ran away with money O, kolluqdan çıxdı, mәnim qarnıma bir tәpik vurdu vә pulumu götürüb qaçdı;* 5. qovmaq *(işdәn)*; *They gave him the boot for coming late Gecikdiyinә görә onu işdәn qovdular;*

◊ *The boot is on the other foot İndi o dövran deyil, Vәziyyәt dәyişib;* **to die in *one's* ~s / with *one's* ~s on** 1) vaxtsız / vaxtından әvvәl ölmәk; 2) iş başında ölmәk; **to have *one's* heart in *one's* ~s** qorxmaq, ürәyi ağzına gәlmәk *(bәrk qorxmaq)*; **to lick the ~s** ayaqqabı yalamaq, yaltaqlanmaq

**boot²** [bu:t] *v* I 1. botinka / çәkmә geymәk; 2. tәpiklә vurmaq, tәpiklәmәk; 3. *jarq.* işdәn qovmaq

**boot** [bu:t] *v* II 1. kömәk etmәk, faydalı olmaq; *What boots it? Bundan nә fayda? It boots not Bu faydasızdır, Bunun faydası yoxdur;* 2. *jarq.* әvvәlcәdәn pul almaq, beh almaq

**boot-black** [ˈbu:tblæk] *n* çәkmәsilәn

**booted** [ˈbu:tɪd] *adj* çәkmәli; **black-booted soldiers** qara çәkmәli әsgәrlәr

**bootee** [ˈbu:ti:] *n* 1. qadın çәkmәsi *(isti)*; 2. uşaqlar üçün hörülmüş ayaqqabı

**booth** [bu:ð] *n* 1. kiosk *(xırda şeylәr satmaq üçün xırda budka)*; budka; **sentry ~** saatsaz budkası; **a telephone ~** telefon budkası; 2. sәsvermә üçün budka

**bootlace** [ˈbu:tleɪs] *n* qaytan

**boot-last** [ˈbu:tla:st] *n* ayaqqabı qәlibi

**boot-leg¹** [bu:tleg] *n* 1. çәkmә boğazı; **long ~** uzun çәkmә boğazı; 2. *jarq.* gizlin satılan spirtli içkilәr

**boot-leg²** [bu:tleg] *adj* qadağan/yasaq edilmiş *(spirtli içkilәr haq.)*

**boot-leg³** [ˈbu:tleg] *v jarq.* 1. qanunsuz olaraq spirtli içkilәr alveri ilә mәşğul olmaq; 2. qeyri-qanuni olaraq yaymaq; **to ~ books** qadağan edilmiş kitab satmaq / yaymaq

**boot-legger** [bu:t.legәʳ] *n jarq.* 1. qadağan / yasaq olunmuş spirtli içkilәr alverçisi; 2. qadağan/yasaq edilmiş mallar satan *(adam)*

**bootless¹** [ˈbu:tlɪs] *adj* I çәkmәsiz, ayaqyalın, yalınayaq, ayaqqabısız

**bootless²** [bu:tlɪs] *adj* II mәnasız, boş, әbәs, sәmәrәsiz, faydasız; ~ **care** mәnasız/faydasız qayğı; ~ **effort** boş / әbәs / faydasız cәhd

**bootlick¹** [ˈbu:tlɪk] *n amer. jarq.* = **bootlicker**

**bootlick²** [ˈbu:tlɪk] *v amer. jarq.* yaltaqlıq etmәk, yaltaqlanmaq, daban yalamaq; *He bootlicked anybody suspected of having money O pul olduğunu güman edәn hәr bir kәsә yaltaqlıq edirdi*

**bootlicker** [ˈbu:tlɪkәʳ] *n jarq.* yaltaq, qılığagirәn *(adam)*

**bootmaker** [ˈbu:t.meɪkәʳ] *n* çәkmәçi, çәkmәtikәn

**boot-top** [ˈbu:ttɔp] *n* çәkmәnin boğazı

**boot-tree** [ˈbu:ttri:] *n* = **boot-last**

**booty** [ˈbu:tɪ] *n* 1. qәnimәt; 2. oğurluqla / qarәtlә әldә edilmiş mal / şey;

◊ **to play ~** 1) udmaq üçün oyundaşa kömәk etmәk; 2) yarışda fırıldaq / biclik işlәtmәk

**booze¹** [bu:z] *n d.d.* 1. içki; spirtli içki; 2. içki mәclisi; **to be on the ~** sәrxoşluq / әyyaşlıq etmәk

**booze²** [bu:z] *v d.d.* sәrxoşluq / әyyaşlıq etmәk, içkiyә meylli olmaq / hәvәs göstәrmәk, içki içmәyi sevmәk / xoşlamaq



**boozer** [ˈbu:zәʳ] *n d.d.* 1. әyyaş, içki duşkünü; 2. pivәxana, pivә satılan yer

**boozily** [ˈbu:zɪlɪ] *adv* sәrxoş halda/vәziyyәtdә, sәrxoş-sәrxoş, sәrxoşcasına

**booziness** [ˈbu:zɪnɪs] *n* sәrxoşluq, әyyaşlıq

**boozy** [ˈbu:zɪ] *adj d.d.* 1. sәrxoş, әyyaş; 2. әyyaşlıq / sәrxoşluq edәn

**bop¹** [bɔp] *n* bibop *(caz musiqisinin bir növü)*

**bop²** [bɔp] *v* (**-pp-**) 1. caz musiqisinә oynamaq; 2. *amer.* әl ağacı ilә vurmaq

**bopper** [ˈbɔpәʳ] *n d.d.* caz musiqisi çalan musiqiçi

**boppist** [ˈbɔpɪst] *n* = **bopper**

**bopster** [ˈbɔpstәʳ] *n* = **bopper**

**boracic** [bәˈræsɪk] *adj* borat; ~ **acid** borat turşusu

**border¹** [ˈbɔ:dәʳ] *n* 1. bordyur, haşiyә, köbә; yelәn; *Her handkerchief had a white border Onun әl yaylığının ağ yelәni/köbәsi vardı;* 2. sәrhәd; **on the ~** sәrhәddә, sәrhәd rayonlarında; **out of ~s** sәrhәddәn kәnarda, xarici ölkәdә; **over the ~** sәrhәdin o tayında; **within our ~s** sәrhәdlәrimiz daxilindә, ölkәmizdә; *No man within our borders knows it Bizim ölkәmizdә heç kim bunu bilmir;* 3. hәdd, hüdud; **beyond the ~ of science** elmin hüdudundan kәnarda; **to be on the ~ of** bir şeylә yanaşı olmaq

**border²** [ˈbɔ:dәʳ] *v* 1. hәmsәrhәd olmaq, yanaşı / qonşu olmaq; *The two countries border on / upon one another Bu iki ölkә bir-biri ilә hәmsәrhәddir;* 2. oxşamaq, oxşar olmaq, bәnzәmәk, bәnzәr olmaq; *This borders upon truth Bu, hәqiqәtә oxşayır / bәnzәyir;* **colour ~ing on red** qırmızıya oxşayan / bәnzәyәn rәng; 3. dövrәlәmәk, haşiyәlәmәk, haşiyә çәkmәk, әhatә etmәk; *The fields are bordered by large forests Sahәlәr böyük meşәlәrlә әhatә olunmuşdur*

**bordered** [ˈbɔ:dәd] *adj* haşiyәlәnmiş, haşiyә çәkilmiş; köbәlәnmiş, әhatә olunmuş

**borderer** [ˈbɔ:dәrәʳ] *n* sәrhәd zonasında yaşayan adam, sәrhәd zonasının sakini

**border-land** [ˈbɔ:dәlænd] *n* 1. sәrhәd rayonu / zolağı *(xüsusәn İngiltәrә vә Şotlandiya arasında)*; 2. aralıq sahә *(elmdә)*

**border-line** [ˈbɔ:dәlaɪn] *n* sәrhәd, sәrhәd xәtti; demarkasiya xәtti; **the ~ between France and Germany** Fransa ilә Almaniya arasında sәrhәd xәtti; **the ~ between sleeping and waking** yatmaqla oyaqlıq arasında sәrhәd

**bore¹** [bɔ:ʳ] *n* I 1. burğu ilә açılmış deşik / dәlik; 2. silahın kalibri *(silah lülәsi diametrinin ölçüsü)*; lülәnin növü *(silahda)*

**bore** [bɔ:ʳ] *n* II 1. darıxma, sıxıntı, üzüntü; *What a bore! Nә darıxdırıcıdı!;* 2. darıxdırıcı / usandırıcı adam; *He is a terrible bore O, dәhşәtli darıxdırıcı / usandırıcı adamdır*

**bore²** [bɔ:ʳ] *v* I 1. deşmәk, dәlmәk *(burğu ilә)*; oymaq, yonmaq; 2. qazmaq *(quyu)*; 3. özünә çәtinliklә yol açmaq

**bore** [bɔ:ʳ] *v* II cana gәtirmәk, zәhlәsini tökmәk, tәngә gәtirmәk, bezikdirmәk, usandırmaq; *He bores me stiff O mәni lap tәngә gәtirir / bezikdirir/ usandırır*

**boredom** [ˈbɔ:dәm] *n* 1. sıxıntı, darıxma, üzüntü, ürәk sıxıntısı; 2. maraqsızlıq, darıxdırıcılıq, süstlük

**borehole** [ˈbɔ:houl] *n* buruq quyusu

**bore-well** [ˈbɔ:wel] *n* 1. artezian quyusu; 2. buruq quyusu

**borer** [ˈbɔ:rәʳ] *n* 1. burğu, matqab, burov *(qazma maşını)*; 2. qazmaçı, buruq fәhlәsi

**boric** [ˈbɔ:rɪk] *adj kim.* borat; ~ **acid** borat turşusu

**boring¹** [ˈbɔ:rɪŋ] *n* I 1. deşmә, deşilmә, dәlmә, dәlinmә, burğu ilә deşmә/deşilmә; oyma, yonma, yonulma; 2. qazıma, qazma; 3. buruq quyusu; 4. burğu ilә açılmış deşik / dәlik

**boring** [ˈbɔ:rɪŋ] *n* II zәhlә tökmә, cana gәlmә, cana gәtirmә, usandırma, usandırıcılıq

**boring²** [ˈbɔ:rɪŋ] *adj* I 1. deşmә, deşәn, deşici; 2. buruq, qazma üçün *(nәzәrdә tutulan)*; 3.: ~ **bar** buruq dәzgahı, buruq maşını; buruq çәkici; perferator *(süxur qazmaq üçün mexaniki burğu)*; ~ **tool** deşmә alәti

**boring** [ˈbɔ:rɪŋ] *adj* II zәhlәtökәn, tәngә gәtirәn, zәhlә aparan, bezikdirici, usandırıcı, qarayaxa, ürәksıxan, cansıxan, maraqsız; ~ **day** cansıxıcı/ usandırıcı gün

**born¹** [bɔ:n] *adj* 1. anadangәlmә, anadandoğulma; fitri; **a ~ poet/actor/singer** *etc.* anadangәlmә şair /aktyor /müğәnni vә s.; **to be ~** 1) anadan olmaq, doğulmaq; *The baby was born at 8 o'clock Uşaq saat 8-dә anadan oldu / doğuldu; I was born in 1929 Mәn 1929-cu ildә anadan olmuşam;* 2) yaranmaq, doğmaq; *This party was born at a small meeting Bu partiya kiçicik bir iclasda yarandı; His wish to become a doctor was born of a desire to help sick people Onun hәkim olmaq istәyi xәstә adamlara kömәk etmәk arzusundan doğmuşdu;* 2. әslәn, zatәn; *Carlos was born French, but grew in England Karlos zatәn /әslәn fransız idi, lakin İngiltәrәdә böyümüşdü;* **nobly ~** әslәn / zatәn zadәgan; **to be nobly ~** әslәn / zatәn zadәgan olmaq; **~ and bred** doğulub boya-başa çatma; *He was born and bred in London O, Londonda doğulmuş vә orada da boya-başa çatmışdı;*

◊ **~ with a silver spoon in *one's* mouth** ≅ xoşbәxt doğulmuş, xoşbәxt ulduz altında doğulmuş; **in all my ~ days** ömrüm boyu

**born²** [bɔ:n] **to bear** *felinin pp forması*

**-born** [bɔ:n] *mürәkkәb sözlәrin komponenti:* -lı, -li, -lu, -lü; American-**born** amerikalı; 2. törәtdiyi, yaratdığı; war-**born** crime müharibәnin törәtdiyi cinayәt

**boron** [ˈbɔ:rɔn] *n kim.* bor

**borough** [ˈbʌrә] *n* 1. kiçik şәhәr; yaşayış mәntәqәsi; müәyyәn hüquqlara malik olan mәntә-

qə/ərazi; **Parliamentary** ~ ingilis parlamentində təmsil olunan şəhər; **close / pocket** ~ *tar.* seçkisi bir adamın nəzarətində olan şəhər; 2. parlamentə bir və ya bir neçə nümayəndə seçən şəhər; **to own / to buy a** ~ hər-hansı bir dairədə seçkiyə nəzarət etmək; 3. *amer.* Nyu-Yorkun beş rayonundan biri

**borrow** [ˈbɔrou] *v* 1. borc almaq / etmək; **to ~ smth. of / from smb.** bir kəsdən bir şeyi borc almaq; **to ~ fifty dollars from a friend** dostların birindən əlli dollar borc almaq; 2. *isteh.* oğurlamaq, götürmək; *Somebody seems to have borrowed my watch when I was busy Görünür mənim başım qarışıq olanda kimsə mənim saatımı götürüb/oğurlayıb;* 3. *arx.* zamin olmaq *(bir kəsə)*; 4. götürmək, almaq; mənimsəmək, iqtibas etmək; *He borrowed my theory O mənim nəzəriyyəmi mənimsəyib;*

◊ **to ~ trouble** özünü xataya / bəlaya salmaq

**borrowed** [ˈbɔroud] *adj* 1. borc alınmış / götürülmüş; 2. başqa, özgə; *He travelled under a borrowed name O, başqa ad altında səyahət etdi*

**borrowing** [ˈbɔrouıŋ] *n* 1. borc alma/götürmə; **to go ~** borc istəmək; 2. *dilç.* alınma söz; *English has many borrowings from other languages İngilis dilində başqa dillərdən alınma çoxlu söz var*

**borscht** [bɔ:ʃt] *n* borş

**bosh** [bɔʃ] *n* boş/cəfəng danışıq; *Don't talk bosh! Boş-boş danışma! Axmaq-axmaq danışma!*

**bosom¹** [ˈbuzəm] *n* 1. *şair.* döş, əmcək, məmə; *She had a well developed bosom Onun iri döşü vardı;* 2. köks, sinə; *She held the child to her bosom O, uşağı köksünə basdı; Her bosom was torn by sorrow Onun sinəsini kədər didirdi/parçalayırdı/dağıdırdı;* 3. qoyun; *She hid the letter in the bosom O, məktubu qoynunda gizlətdi;* 4. səth, üz; **the calm ~ of the lake** gölün sakit səthi; 5. sinə, yaxa *(paltarda)*; **the ~ of his shirt** onun köynəyinin sinəsi; 6. ağuş, qucaq; **in the ~ of nature** təbiətin ağuşunda; *He spent his last years in the bosom of his family O, son illərini ailəsinin əhatəsində keçirdi;*

◊ **to take** *smb.* **to** *one's* **~ 1)** bir kəsə yaxınlaşmaq, bir kəslə dostlaşmaq; 2) bir kəslə evlənmək

**bosom²** [ˈbuzəm] *adj* çox yaxın, səmimi; **~ friend** yaxın / səmimi dost

**bosomed** [ˈbuzəmd] *adj* gizli, gizlin; məxfi, **a house ~ in trees** ağaclar içində gizlənmiş ev

**bosomy** [ˈbuzəmı] *adj* yekədöşlü, iridöşlü, iriməməli; **a ~ woman** iridöşlü/yekədöşlü arvad / qadın

**boss¹** [bɔs] *n* I boss, sahibkar; müəssisə sahibi

**boss** [bɔs] *n* II *jarq.* səhv, xəta, yanılma

**boss** [bɔs] *n* III şiş; çıxıntı; fır

**boss** [bɔs] *n* IV tabaq; baca, deşik

**boss** [bɔs] *n* V *amer.* inək; düyə

**boss²** [bɔs] *v* I 1. ağa /sahib olmaq; 2. əmr / göstəriş/sərəncam vermək, rəhbərlik/başçılıq etmək; **to ~ the show** hamıya rəhbərlik/başçılıq etmək, hamıya əmr / sərəncam vermək

**boss** [bɔs] *v* II 1. hədəfi vura bilməmək, hədəfdən yan keçmək, səhv atmaq, düz ata bilməmək; *He had six shots at the target and he bossed every time O, hədəfə altı dəfə atəş açdı, lakin heç birində hədəfi vura bilmədi;* 2. qarışdırmaq, korlamaq; *You are simply bossing up the whole show Sən / Siz sadəcə olaraq bütün işləri korlayırsan / korlayırsınız*

**boss** [bɔs] *v* III 1. qabarıq bəzək vurmaq; 2. qabarıq naxışla / ornamentlə bəzəmək

**boss-eyed** [ˈbɔsaıd] *adj d.d.* 1. çəpgöz; taygöz; 2. biryanlı, birtərəfli; 3. hiyləgər, fırıldaq, dələduz

**bossy¹** [ˈbɔsı] *n amer. d.d.* 1. inək; 2. ət; **a slice of ~** bir parça ət; **~ in bowl** buğda / öz suyunda bişirilmiş ət

**bossy²** [ˈbɔsı] *adj* amiranə; **a ~ person** əmr verməyi sevən adam

**botanic** [ˈbəˈtænık] *adj* botanika; **the Botanic Gardens** Botanika Bağı *(Londonda)*

**botanical** [ˈbəˈtænıkəl] *adj* 1. botanika; **a beautiful ~ garden** gözəl botanika bağı; 2. bitkilərdən alınmış; **~ drugs** bitkilərdən alınmış dərmanlar

**botanist** [ˈbɔtənıst] *n* botanik, nəbatatçı

**botanize** [ˈbɔtənaız] *v* 1. öyrənmək məqsədilə bitki toplamaq; **to ~ in the Caucasus** öyrənmək üçün Qafqazda bitki toplamaq; 2.: **to ~ Ecuador** Ekvadorun bitkilərini toplamaq üçün ora səyahət etmək

**botany** [ˈbɔtənı] *n* botanika

**botch¹** [bɔtʃ] *n* 1. yamaq, pinə; 2. pis / yöndəmsiz görülmüş iş, korlama, xarab etmə; *He made miserable of botch of this article O bu məqaləni tamamilə korladı;* 3. pis işçi, işi pis görən adam

**botch²** [bɔtʃ] *v* xarab etmək, korlamaq; **to ~ a block of marble** bir blok mərməri xarab etmək / korlamaq; *I tried to cook a nice dinner, but I'm afraid I've botched it (up) Mən çalışdım ki, bir yaxşı nahar hazırlayam, amma qorxuram ki, onu korlamışam*

**botched** [bɔtʃd] *adj* pis görülmüş, uydurulmuş, başdansovma; **a ~ job** pisgörülmüş / başdansovma görülmüş iş

**botcher** [ˈbɔtʃəʳ] *n* I pis işçi

**botcher** [bɔtʃəʳ] *n* II cavan qızılbalıq

**botchy** [ˈbɔtʃı] *adj* bacarıqsız, qabiliyyətsiz

**both¹** [bouθ] *adj* hər iki(si), ikisi də; **~ feet** hər iki ayaq; **~ his eyes** onun hər iki gözü; *Both sisters are doctors Hər iki bacı həkimdir; Both her brothers are teachers Onun hər iki qardaşı müəllimdir; I kissed her on both cheeks Mən onun hər iki yanağından öpdüm; Both of my sons are at the front Mənim oğlanlarımın hər ikisi cəbhədədir*

**both²** [bouθ] *pron* hər iki, ikisi də, həm bu, həm də o; *I see them both Mən onların hər ikisini də görürəm;* **~ of them** onlardan hər ikisi; *Both of them joined us Onların hər ikisi bizə qoşuldu;* **~ of his eyes** onun hər iki gözü; *Both of his eyes are well Onun hər iki gözü yaxşıdır; I like John and Mary both Mən həm Conu, həm də Merini xoşlayıram; They are both gone Onların ikisi də gedib; Both of these possibilities must be taken into account Bu imkanların ikisi də nəzərə alınmalıdır*

**both³** [bouθ] *adv* də, da, həm də, həmçinin; eyni zamanda; *I have seen both your son and daughter Mən sənin/sizin oğlunu/oğlunuzu da, qızını/qızınızı da görmüşəm*

**both⁴** [bouθ] *conj:* **both … and** da … də, həm… həm də; **~ New York and London** Nyu-York da, London da; *He both speaks and writes English O, ingiliscə həm danışır, həm də yazır*

**bother¹** [ˈbɔðəʳ] *n* 1. əziyyət, narahatlıq, təlaş, nigarançılıq; narahatlıq/nigarançılıq mənbəyi; *We had a lot of bother finding our way here Biz buraya yolumuzu tapmaq üçün çox əziyyət çəkdik;* 2. yük, əziyyət; *I don't want to be a bother to you Mən sənə/sizə əziyyət vermək istəmirəm, Mən sənə/sizə yük olmaq istəmirəm*

**bother²** [ˈbɔðəʳ] *v* 1. bezikdirmək, cana gətirmək, usandırmaq, təngə gətirmək, bezar etmək; narahat etmək; *Don't bother me with foolish questions Axmaq suallarla məni təngə gətirmə/gətirməyin; He bothers me to death O məni lap təngə gətirir / usandırır; I'm busy don't bother me Mən məşğulam; zəhləmi tökmə/tökməyin;* 2. narahat etmək; *I'm sorry to bother you, but can you tell me the time? Səni/Sizi narahat etdiyim üçün üzr istəyirəm, sən/siz vaxtın neçə olduğunu deyə bilərdinmi/bilərdinizmi?;* 3. narahat etmək; *His heart has been bothering him Ürəyi onu narahat edir;* 4. özünə zəhmət vermək, zəhmət çəkmək; *Don't bother to lock the door Zəhmət çəkməyin, qapını bağlamaq lazım deyil;*

◊ **to ~** *one's* **head / brains** baş sındırmaq; *Don't bother your head about me! Məndən narahat olma!/olmayın!*

**bothersome** [ˈbɔðəsəm] *adj* 1. təngəgətirən, zəhlətökən, usandıran; cansıxan, darıxdıran, zıqqı, zəhləaparan; **~ people** zəhlətökən / təngəgətirən / zəhləaparan adamlar; 2. narahat, aramsız, qərarsız, nadinc

**bottle¹** [ˈbɔtl] *n* 1. butulka, şüşə; **a ~ of wine** bir butulka şərab; *He drank 3 bottles of wine O, 3 butulka şərab içdi;* 2. *məc.* içki, şərab, çaxır, araq; **to be too fond of the ~** içki dəlisi/hərisi olmaq, içməyi sevmək, içkiyə aludə olmaq; 3. əmzik şüşəsi; **to bring up a child on the ~** uşağı əmzik şüşəsi ilə böyütmək;

◊ **to crack a ~ together** bir kəslə butulkanı boşaltmaq / içmək; **to pass the ~ of smoke** ikiüzlülük / riyakarlıq etmək, bir şeyi bilib deməmək

**bottle²** [ˈbɔtl] *v* butulkalara tökmək; butulkada saxlamaq; **to ~ wine** şərabı butulkalara tökmək; **to ~ up 1)** kip bağlamaq, tıxamaq; 2) saxlamaq, gizlətmək; **to ~ up** *one's* **anger** acığını/hirsini gizlətmək; 3) *hərb.* mühasirəyə almaq; **to ~ up enemy's fleet** düşmən donanmasını mühasirəyə almaq

**bottle-brush** [ˈbɔtlbrʌʃ] *n* 1. butulka yumaq üçün şotka; 2. *bot.* qatırquyruğu *(bitki)*

**bottled** [ˈbɔtld] *adj* butulka; **~ beer/wine,** *etc.* butulka pivəsi / şərabı

**bottle-glass** [bɔtlglaːs] *n* butulka şüşəsi

**bottle-green** [ˈbɔtlgriːn] *adj* tünd-yaşıl

**bottleful** [ˈbɔtlful] *n* butulka dolusu, bir butulka, **~ of wine** bir butulka şərab

**bottle-head** [ˈbɔtlhed] *n* 1. *arx.* gic, axmaq, sarsaq; 2. *zool.* balaca balina

**bottle-holder** [ˈbɔtl.houldəʳ] *n* 1. sekundant *(boksda)*; 2. tərəfdar, tərəfkeş, köməkçi

**bottle-neck** [ˈbɔtlnek] *n* 1. butulkanın boğazı; 2. dar keçid; dalan; 3. *məc.* dar yer; maneə, əngəl, çətinlik; *I hope the book will come out on time in spite of all the bottle-necks Mən ümid edirəm ki, bütün maneələrə / əngəllərə baxmayaraq kitab vaxtında işıq üzü görəcək/çapdan çıxacaq*

**bottle-opener** [ˈbɔtl.oupənəʳ] *n* butulka ağzı açan

**bottle-screw** [ˈbɔtlskruː] *n* burğu, probkaaçan

**bottle-washer** [ˈbɔtl.wɔʃəʳ] *n* butulka yuyan

**bottom¹** [ˈbɔtəm] *n* 1. dib; **the ~ of the sea/ lake /ocean,** *etc.* dənizin / gölün / okeanın *və s.* dibi; **at the ~ of the sea** dənizin dibində; **to go to the ~** dibinə getmək; **to touch ~ 1)** dibinə toxunmaq, dibinə çatmaq; 2) ən aşağı səviyyəyə enmək; *The market has touched bottom Bazarda qiymətlər ən aşağı səviyyəyə düşüb/ enib;* 3) *məc.* tamamilə düşgünləşmək/ruhdan düşmək; 2. dib, alt; **the ~ of a bucket / of a cup** vedrənin/parçın altı; **to drain/to empty a goblet to the ~** badəni dibinə qədər içmək; 3. ətək, aşağı, aşağı hissə; son; **the ~ of a mountain** dağın ətəyi/dibi; **from top to ~** yuxarıdan aşağıya qədər/kimi; **at the ~ of a page** səhifənin aşağısında / aşağı hissəsində; **at the ~ of the stairs** pilləkənin aşağı meydançasında / qurtaracağında; **at the ~ of a table** stolun qurtaracağında/sonunda; 4. oturacaq *(stul haq.)*; 5. *d.d.* sağrı, göt, yanbız; **to fall on** *one's* **~** götü üstə yıxılmaq; *I'll smack your bottom Mən sənin yanbızına döyəcəm;* 6. əsas, mahiyyət, məğz; **to get to the ~ of** *smth.* bir şeyin mahiyyətinə varmaq; **to be at the ~ of** *smth.* bir şeyə səbəb olmaq; 7. möhkəmlik, dözümlülük; **a horse of good ~** dözümlü at; 8. qurtaracaq, son; *I'll walk with you to the bottom of the road Mən səninlə / sizinlə yolun qurtaracağına qədər gedəcəm; We grow vegetables at the bottom of our garden Biz bağımızın qurtaracağında tərəvəz yetişdiririk;*

◊ **at the ~ of the heart** ürəyin dərinliyində, ürəyin ən dərin guşəsində; **from the ~ of the heart** ürəyin ən dərin guşəsindən; **to have no ~** sonu olmamaq; *There is no bottom to it Bunun sonu yoxdur; Bottoms up Axıra kimi iç / için;* **to stand on *one's* own ~** müstəqil olmaq, asılı olmamaq

**bottom²** ['bɔtəm] *adj* 1. aşağı, ən aşağı; **~ shelf** aşağı rəf; **~ row** aşağı cərgə; 2. sonuncu, axırıncı; **~ price** son/axırıncı qiymət; 3. dibdə olan

**bottom³** ['bɔtəm] *v* 1. oturacaq qayırmaq / düzəltmək; **to ~ a chair** stula oturacaq düzəltmək; 2. dibə toxunmaq; dərinliyi ölçmək; 3. mahiyyətə varmaq, səbəbini axtarmaq; **to ~ *smb.'s* plans** bir kəsin planını başa düşmək; 4. **(on, upon)** əsaslandırmaq, əsaslanmaq; *His arguments were bottomed on good examples Onun arqumentləri yaxşı misallarla əsaslandırıldı; On what do his arguments bottom? Onun arqumentləri nəyə əsaslanır?* 5. *tex.* astarlamaq, astar çəkmək

**bottomed** ['bɔtəmd] *adj* 1. dibi olan; 2. əsaslı, əsası olan, əsaslandırılmış

**bottom-grass** ['bɔtəmgra:s] *n* düzən otu, düzəndə bitən ot

**bottom-land** ['bɔtəmlænd] *n amer.* çaybasar/subasar sahə, çaylaq

**bottomless** ['bɔtəmlıs] *adj* 1. dibsiz, çox dərin, dibi olmayan; **~ abyss** çox dərin uçurum; 2. *məc.* hədsiz, hüdudsuz, həddi-hüdudu olmayan; *His kindness seems bottomless, but in fact he will soon have no more money to give away Onun mərhəmətinin elə bil həddi-hüdudu yoxdur, belə getsə tezliklə onun xərcləməyə də pulu olmayacaq;* 3. dərkedilməz, anlaşılmaz, ağlasığmaz; **~ mystery** anlaşılmaz / dərkedilməz sirr; 4. əsaslandırılmamış; **~ arguments** əsaslandırılmamış arqumentlər; 5. oturacaqsız; **~ chair** oturacaqsız stul

**botulism** ['bɔtjulızm] *n tib.* botulizm *(konservləşdirilmiş ət, balıq və ya tərəvəzdən zəhərlənmə)*

**boudoir** ['bu:dwa:r] *n fr.* buduar *(keçmişdə varlı qadınların qəbul otağı)*

**bought** [bɔ:t] **to buy** *felinin pt, pp formaları*

**boughten** ['bɔ:tn] *adj amer.* hazır alınmış; **~ shirt** hazır alınmış köynək

**bouillon** [bu:'jɔ:ŋ] *n fr.* bulyon, ət suyu

**boulevard** ['bu:lva:d] *n fr.* bulvar

**bounce¹** [bauns] *n* 1. atılma, hoppanma, tullanma, sıçrama; sıçrayış; **with a ~** bir sıçrayışla; *The boy caught the ball at the bounce Oğlan topu bir sıçrayışda tutdu;* **to run / to spring up the stairs in four or five ~s** pilləkəni dörd və ya beş sıçrayışda qalxmaq; 2. yerə enərkən atlanma *(təyyarə haq.)*; yolda atılıb düşmə *(avtomobil haq.)*; 3. *hərb.* rikoşet, sapma, sıçrama *(güllə və s. haq.)*; 4. güclü və qəfil zərbə; *The bounce burst open the door Güclü və qəfil zərbədən qapı taybatay açıldı;* 5. elastiklik; *The ball has lost its bounce Top öz elastikliyini itirib;* 6. gopçuluq, özünü öymə, özünü tərifləmə, lovğalıq, gop; *The whole story is a bounce Bütün bu əhvalat gopdur*

**bounce²** [bauns] *v* 1. sıçramaq, hoppanmaq; atılıb düşmək; *The ball doesn't bounce well Top yaxşı sıçramır; The boy was bouncing up and down on the bed Oğlan çarpayının üstündə atılıb düşürdü;* 2. atıb-tutmaq, yerə enərkən atıb-tutmaq *(təyyarə haq.)*; yolda atıb-tutmaq *(avtomobil haq.)*; *Occupants of the car were bounced from side to side Maşın oturanları o yan bu yana atıb tuturdu; The mother bounced the baby on her knee Ana uşağı dizi üstündə atıb-tuturdu;* 3. dəyib geri qayıtmaq, sapmaq *(güllə və s.)*; 4. atılıb düşə-düşə yerimək; yöndəmsiz tərzdə yerimək / hərəkət etmək; 5. **(into)** atılmaq, sıçramaq, soxulmaq; yaxa qurtarmaq, canını qurtarmaq, xilas olmaq; **to ~ into the room** otağa soxulmaq; 6. **(out of)** sıçrayıb çıxmaq; sıçramaq; **to ~ out of the room** otaqdan sıçrayıb çıxmaq; **to ~ out of a chair** stoldan sıçramaq; *She bounced out of the house and never came back O, evdən çıxdı və bir daha geri dönmədi;* 7. lovğalanmaq, özünü öymək, öyünmək, özünü tərifləmək; *Don't listen to him, he is bouncing Ona qulaq asma/ asmayın, o özünü öyür / tərifləyir;* 8. *jarq.* bank tərəfindən yararsız şey kimi geri qaytarılmaq *(çek haq.)*

**bouncer** ['baunsəʳ] *n* 1. atlanıb-düşən, atılıb-düşən *(şey)*; *That rubber ball is a good bouncer O rezin top yaxşı atılıb-düşür;* 2. yalançı, gopçu; 3. gop, özünü öymə / tərifləmə; ağ yalan; 4. nəhəng, zorba, çox yekə *(şey, adam)*; 5. bank tərəfindən ödənilə bilməyən çek; 6. *arzuolunmaz adamları çölə atmaq məqsədilə işə götürülən güclü adam (xüs. klub və mehmanxanada)*

**bouncily** ['baunsılı] *adv* cəldliklə, cəld bir tərzdə, zirək, zirək bir tərzdə, qıvraq, diribaş

**bounciness** ['baunsınıs] *n* 1. elastiklik; 2. cəldlik, diribaşlıq, zirəklik; oynaqlıq

**bouncing** ['baunsıŋ] *adj* 1. sağlam, böyük, boylu-buxunlu, yekəpər, gövdəli; **five ~ boys** beş boylu-buxunlu oğlan; 2. özünü öyən, lovğa, gopçu

**bouncy** ['baunsı] *adj* 1. elastiki; **a ~ ball** elastiki top; 2. cəld, oynaq, şux, diri, diribaş, zirək, qıvraq; **a ~ person** cəld / diribaş/zirək adam; **a ~ manner** cəld/oynaq davranış

**bound¹** [baund] *n* I 1. sərhəd, hüdud; **the farthest ~s of ocean** okeanın uzaq hüdudları; *There are no bounds to his ambitions Onun arzularının sərhədi/hüdudu yoxdur;* 2. hədd, hüdud; **to overstep all the ~s** bütün hüdudları/hədləri aşmaq; **to keep within ~s** hüdudu gözləmək/aşmamaq/keçməmək; **to pass all ~s** bütün hədləri/hüdudları keçmək; **to put/to set ~s to *smth.*** bir şeyə hədd/hüdud qoymaq, bir şeyin həddini/hüdudunu gözləmək / aşmamaq



**bound** [baund] *n* II 1. sıçrama, sıçrayış, hoppanma; **with one ~** bir sıçrayışla; **a ~ forward** irəli sıçrama / sıçrayış; 2. *hərb.* qaçaraq düşmən tərəfə keçmə; 3. dəyib qalxma *(top haq.)*; **to catch a ball on the ~** topu yerə dəyib qalxanda tutmaq; 4. rikoşet, dəyib yana sıçrama *(güllə, top və s.)*, sapma *(güllə, top və s.)*

**bound²** [baund] *adj* I 1. qeyri-sərbəst, bağlı; **~ morphemes** *qram.* qeyri-sərbəst morfemlər; 2. mükəlləfiyyətli, borclu; **~ to military service** hərbi mükəlləfiyyətli, hərbi xidmət keçməyə borclu; *He is legally bound to do it Qanuna görə o bunu etməlidir;* 3. hökmən, labüd, mütləq; *Something is bound to happen Nəsə hökmən baş verməlidir; He is bound to come O hökmən gəlməlidir; This horse is bound to win Bu at mütləq qalib gəlməlidir (cıdırda); He is bound to die O hökmən / mütləq ölməlidir; It is bound to rain soon Mütləq tezliklə yağmalıdır;* 4. cildlənmiş, cildli *(kitab və s. haq.)*; **~ in leather** dəri ilə cildlənmiş, dəridən cild çəkilmiş; **a book ~ in leather** dəridən cild çəkilmiş kitab, dəri cildli kitab; **~ up with** asılı; **to be ~ up with** asılı olmaq; *His future is bound up with that of the company he works for Onun gələcəyi işlədiyi şirkətdən asılıdır*

**bound** [baund] *adj* II 1. hazırlaşan, hazır olan *(əsasən yola düşməyə)*; *The ship is bound for a voyage Gəmi səyahətə hazırdır;* **~ to start on Sunday** bazar günü yola düşməyə hazır olan; 2. istiqamət alan / götürən; **a ship ~ for / to London** Londona istiqamət götürən gəmi

**bound³** [baund] *v* I 1. hədd qoymaq, həmsərhəd olmaq; *The US is bounded on the north by Canada and on the south by Mexico Birləşmiş Ştatlar şimalda Kanada ilə, cənubda Meksika ilə həmsərhəddir;* 2. *amer.* sərhədi göstərmək; **to ~ France** Fransanın sərhədini göstərmək; 3. məhdudlaşdırmaq, hüdudlaşdırmaq; *You should bound your desires Sən/Siz arzularını/arzularınızı məhdudlaşdırmalısan / məhdudlaşdırmalısınız*

**bound** [baund] *v* II 1. atlanmaq, atılmaq, hoppanmaq, tullanmaq, sıçramaq; sürətlə / bərk qaçmaq, çapmaq; *His dog came bounding to meet him Onun iti qaçaraq onu qarşılamağa gəldi;* 2. bərk / sürətlə döyünmək, çırpınmaq; *His heart bounded with joy Onun ürəyi sevincdən bərk döyündü / çırpındı;* 3. tullanmaq, sıçramaq, yerə dəyib geri qayıtmaq *(top və s. haq)*; *The ball struck the wall and bounded back Top divara dəydi və geri sıçradı / qayıtdı;* 4. *hərb.* sapmaq, dəyib kənara getmək, yana sıçramaq *(güllə və s. haq.)*

**bound⁴** [baund] **to bind** *felinin pt, pp formaları*

**boundary¹** ['baundərı] *n* 1. sərhəd; **artificial / natural ~** uydurma/təbii sərhəd; **land boundaries** quru sərhədlər; **to draw / to extend boundaries** sərhədləri müəyyənləşdirmək/genişləndirmək; *The new boundaries of the country were fixed after the war Ölkənin yeni sərhədləri müharibədən sonra müəyyənləşdirildi;* 2. hüdud

**boundary²** ['baundərı] *adj* sərhəd; **~ river** sərhəd çayı; **~ line** sərhəd xətti; **the ~ line between the two countries** iki ölkə arasında sərhəd xətti

**boundless** ['baundlıs] *adj* sərhədsiz, hədsiz, hüdudsuz, sonu olmayan; **~ wealth** hədsiz dövlət; **~ imagination** hüdudsuz təxəyyül

**boundlessly** ['baundlıslı] *adv* hədsiz, intəhasız, həddən artıq, sonsuz, son dərəcə, nəhayətsiz

**boundlessness** ['baundlısnıs] *n* hədsizlik, intəhasızlıq, sonsuzluq, nəhayətsizlik; **the ~ of his imagination** onun təxəyyülünün intəhasızlığı/nəhayətsizliyi

**bounds** [baundz] *n* hüdud, hədd, hədd-hüdud; *There were no bounds to his foolishness Onun axmaqlığının hədd-hüdudu yox idi; We must put/set bounds to our spending Biz xərclərimizə hüdud/sərhəd qoymalıyıq*

**bounteous** ['bauntıəs] *adj* 1. səxavətli, əliaçıq; 2. bol, çox; zəngin, çoxlu; **~ harvest** bol məhsul

**bounteously** ['bauntıəslı] *adv* bol-bol, bolluca, çoxluca, bol, çoxlu

**bountiful** ['bauntıfl] *adj* = **bounteous**

**bounty** ['bauntı] *n* 1. comərdlik, səxavət, əliaçıqlıq; 2. hədiyyə, bəxşiş; **~ of nature** təbiətin hədiyyəsi; 3. həvəsləndirici dövlət mükafatı

**bouquet** ['bukeı] *n* 1. buket; 2. tərif, mədh, alqış; bəyənmə

**bourg** [buəg] *n tar.* 1. qəsrin yaxınlığında kiçik şəhər və ya kənd; 2. balaca Avropa şəhəri

**bourgeois** ['buəʒwa:] *n* 1. burjua *(burjuaziya sinfindən olan adam)*; 2. *tar.* şəhərli, şəhər əhli

**bourgeoisie** [.buəʒwa:'zi:] *n* burjuaziya; **petty ~** xırda burjuaziya

**bout** [baut] *n* 1. dəfə; **this ~** bu dəfə; **at one ~** bir dəfədə, bir oturuma; 2. tutma *(xəstəlik haq.)*; **~ of fever** qızdırma tutması; **a bad coughing ~** pis öskürək tutması; **~ of drinking** içki düşkünlüyü, içkiyə mübtəla olma, içkiyə aludəlik; 3. yarış, yarışma; qarşılaşma; **boxing ~** boks yarışı

**boutique** [bu:'ti:k] *n fr.* 1. *ən yeni və müasir paltar və digər şeylər satılan balaca mağaza və ya böyük mağazanın filialı (xüs. gənclər üçün);* 2. *böyük mağazaların içində ən yeni paltar və digər şeylər satan balaca mağaza (xüs. qadınlar üçün)*

**bovine** ['bouvaın] *adj* 1. buğa; inək; mal-qara; **~ hides and skins** aşılanmamış mal-qara dərisi; 2. gic, axmaq, sarsaq, küt; 3. gectərpənən, ağırtərpənən

**bow¹** [bou] *n* I 1. yay, kaman *(silah)*; 2. *mus.* kaman yayı; 3. yayşəkilli / yayformalı hər bir şey; 4. *şair.* göy qurşağı, qövsi-qüzeh, qarınənənin örkəni; 5. bant; **a ~ of red ribbon** qırmızı lentdən bağlanmış bant; **to tie shoe-laces in a ~** ayaqqabı qaytanını bant bağlamaq;

**breech-sight** [bri:tʃsaɪt] *n hərb.* nişan, arpacıq *(silahda)*
**breed**[1] [bri:d] *n* 1. cins; **a new ~ of horse/cattle** yeni cins at / mal-qara; 2. əsl, həqiqi; **people of true English ~** əsl / həqiqi ingilis; 3. nəsil; 4. növ; kateqoriya; **thinkers of much the same ~** eyni istiqamətli mütəfəkkirlər; **men of the same ~** eyni fikrə / məsləkə malik olan adamlar
**breed**[2] [bri:d] *v* 1. artmaq, çoxalmaq, törəyib artmaq; artıb çoxalmaq, doğub törəmək; **to ~ true** cins bala/nəsil vermək; **to ~ like rabbits** krolik kimi törəyib artmaq/artıb çoxalmaq, sürətlə çoxalmaq/artmaq; *Those peoples breed like rabbits O xalqlar krolik kimi artırlar;* 2. doğub böyütmək *(bala)*; 3. kürt yatıb bala çıxartmaq *(toyuq, quş və s.)*; bala vermək; *Some animals will not breed when kept in cage Bəzi heyvanlar qəfəsdə saxlanıldıqda bala vermir;* 4. yetişdirmək, becərmək, saxlamaq; **to ~ cattle/ hens/ ducks** mal-qara/ toyuq/ördək yetişdirmək *(saxlamaq)*; *The pond breeds fish Bu hovuzda balıq yetişdirilir;* 5. tərbiyə etmək, təhsil vermək; oxutmaq; **to ~ *smb.* to the law** bir kəsə hüquq təhsili vermək; 6. törətmək, doğurmaq; **to ~ wars** müharibələr törətmək; *War breeds a misery and ruin Müharibə dilənçilik və səfalət doğurur;*
◊ **to ~ in and in** qohumlar arasında nəsildən nəslə nigah bağlamaq; **to ~ out and out** qohumlar arasında nigah bağlamamaq
**breeder** ['bri:də$^r$] *n* 1. törədən, artıran; **cattle ~** maldar, maldarlıq mütəxəssisi; **poultry ~** quşçu, quşçuluq mütəxəssisi; 2. döllük, damazlıq *(buğa, qoç, ayğır və s.)*; 3. təşəbbüsçü, təşəbbüskar
**breeding**[1] ['bri:dɪŋ] *n* 1. artma, çoxalma, doğubtörəmə *(heyvan, quş)*; *Spring is the season of breeding for birds Yaz quşların bala çıxarma fəslidir;* 2. yetişdirmə, becərmə, yetişdirilmə, becərilmə *(heyvan)*; **sheep ~** qoyun yetişdirmə/saxlama, qoyunçuluq; 3. tərbiyə olunma; təhsil alma; *He received his breeding at Oxford O, təhsilini Oksfordda aldı;* 4. tərbiyəlilik, tərbiyə, ədəb; özünü yaxşı aparma; **a man of fine ~** yaxşı tərbiyə görmüş adam; *A person of fine breeding behaves well on all occasions Yaxşı tərbiyə görmüş adam/şəxs bütün hallarda özünü yaxşı aparır*
**breeding**[2] ['bri:dɪŋ] *adj* 1. damazlıq; cins, döllük; **~ sow** cins/döllük/damazlıq donuz; **~ stock** damazlıq/döllük heyvan; 2. *k.t.* cütləşmə; **~ place** cütləşmə yeri; **~ season** cütləşmə dövrü; 3. *k.t.* seleksiya; **~ nursery** seleksiya məntəqəsi *(cins heyvan yetişdirmək üçün)*
**breeding-ground** ['bri:dɪŋgraund] *n* 1. balalama/bala çıxarma yeri; *Sea cliffs are the breeding-ground of many sea-birds Dənizkənarı qayalar bir çox dəniz quşlarının balalama/ bala çıxarma yeridir;* 2. törəmə /əmələgəlmə mənbəyi; *Dirt is the breeding-ground of disease Çirk xəstəliyin əmələgəlmə / törəmə mənbəyidir*
**breeze**[1] [bri:z] *n* 1. meh, sahil küləyi; 2. saatda 4-31 mil sürətində əsən külək;
◊ **to fan the ~s** boş/mənasız işlə məşğul olmaq ≅ xəlbirlə su daşımaq
**breeze**[2] [bri:z] *v* 1. ahəstə / mülayim əsmək *(külək haq.)*; 2. sürətlə getmək; *She breezed along, smiling at everyone Hər kəsin üzünə gülərək o, sürətlə gedirdi*
**breezily** ['bri:zɪlɪ] *adv* canlı, oynaq, şən, qayğısız *(bir tərzdə)*, oynaq tərzdə, şən halda
**breeziness** ['bri:zɪnɪs] *n* oynaqlıq, şənlik, təmizlik *(hava haq.)*
**breezy** ['bri:zɪ] *adj* 1. sərin, küləkli; *It's breezy today, so the clothes we have washed will dry quickly Bu gün hava küləklidir, yuduğumuz paltarlar tez quruyacaq;* 2. təmiz *(hava haq.)*; 3. şən, qayğısız
**brer** [brə:$^r$] *n (***brother** *sözünün qısa forması) amer.* qardaş; **Brer Rabbit** Dovşan Qardaş
**brethren** ['breðrɪn] *n şair.* 1. **brother** *isminin cəm forması;* 2. *pl.* yoldaş, peşə/sənət yoldaşı; -daş, -həm; qardaşlar; **~ in arms** silah yoldaşı, silahdaş
**brevity** ['brevɪtɪ] *n* 1. azömürlülük, az yaşama; **the ~ of human life** insan həyatının/ömrünün qısalığı; 2. qısalıq, müxtəsərlik; **~ of speech** nitqin qısalığı/müxtəsərliyi
**brew**[1] [bru:] *n* 1. bişirmə *(pivə və s.)*; dəm, dəmləmə; *I like a strong brew (of tea) Mən tünd dəmlənmiş çay xoşlayıram*
**brew**[2] [bru:] *v* 1. bişirmək *(pivə və s.)*; 2. dəmləmək *(çay, qəhvə)*; *Don't pour the tea yet - it's still brewing Çayı hələ süzmə/süzməyin, o hələ dəm alır;* 3. təşkil etmək, düzəltmək, fikrində olmaq; *The boys are brewing mischief Uşaqlar nəsə bir şuluqluq etmək fikrindədirlər;* 4. yetişmək, yaxınlaşmaq; *A storm is brewing Tufan yaxınlaşır;*
◊ *As you brew so you must drink at. söz.* ≅ *İti öldürənə sürüdürlər, Öz cəzandır, çək Balaş*
**brewage** ['bru:ɪdʒ] *n* pivəbişirmə, bişirmə *(pivə və s.)*
**brewer** ['bru:ə$^r$] *n* pivəçəkən, pivə zavodu işçisi, pivəbişirən
**brewer's barley** ['bru:əz'ba:lɪ] *n bot.* pivə bişirmək üçün arpa
**brewery** ['bru:ərɪ] *n* pivəbişirən zavod
**brewing** ['bru:ɪŋ] *n* 1. pivəbişirmə; 2. bir dəfəyə bişirilmiş pivənin həcmi
**bribability** [ˌbraɪbə'bɪlɪtɪ] *n* pula satılma, satqınlıq
**bribable** ['braɪbəbl] *adj* satqın, pula satılan; **a ~ man** satqın adam
**bribe**[1] [braɪb] *n* rüşvət; ələ alma, öz tərəfinə çəkmə, aldatma *(pulla, rüşvət və s. verməklə)*; **to take ~s** rüşvət almaq/götürmək



**bribe**[2] [braɪb] *v* 1. rüşvət vermək/təklif etmək; *The criminal bribed the policeman to let him go free/into letting him go free Cinayətkar polis nəfərinə rüşvət verdi ki, onu buraxsın;* 2. aldatmaq, ələ almaq, tovlamaq, tərəfinə çəkmək; *(rüşvət, pul, bəxşiş və s. verməklə) The child was bribed with a piece of cake to go to bed Uşağa bir parça pirojna verməklə tovlayıb yatızdırdılar*
**bribeable** ['braɪbəbl] *adj* = **bribable**
**bribeless** ['braɪblɪs] *adj* sadiq, namuslu, etibarlı, dəyanətli
**briber** ['braɪbə$^r$] *n* rüşvət verən *(adam)*
**bribery** ['braɪbərɪ] *n* 1. rüşvətxorluq; 2. satqınlıq; **judicial ~** 1) hakimə rüşvət vermə; hakimi rüşvətlə ələ alma; 2) seçiciləri rüşvət / bəxşiş və s. verməklə öz tərəfinə çəkmə
**bribetaker** ['braɪbˌteɪkə$^r$] *n* rüşvətxor, rüşvət alan
**bric-a-brac** ['brɪkəbræk] *n fr.* 1. qədim bəzəkdüzək/oyun-oyuncaq şeyləri; 2. antikvar / qədim şeylər
**brick**[1] [brɪk] *n* 1. kərpic; klinkr *(odadavamlı kərpic)*; **red ~s** qırmızı kərpic; **yellow ~s** sarı kərpic; **a red ~ house** qırmızı kərpicdən tikilmiş ev; *He used red bricks to build his house O, evini qırmızı kərpicdən tikdirdi/tikdi; The house is brick, not wood Bu ev taxtadan yox, kərpicdən tikilib;* 2. kubşəkilli uşaq oyuncağı; 3. briket *(kərpic şəklində preslənmiş hər hansı bir şey (çay, sabun, dondurma və s.)*; **a ~ of ice cream** bir parça dondurma; **a ~ of soap** bir parça sabun;
◊ **to make ~s without straw** mənasız / boş işlə məşğul olmaq
**brick**[2] [brɪk] *adj* kərpic, klinker; **~ pavement** kərpic / klinker döşənmiş səki
**brick**[3] [brɪk] *v* kərpic hörmək, kərpiclə örtmək
**brickbat** ['brɪkbæt] *n* 1. kərpic qırıntıları; 2. arzuolunmaz / kəskin irad
**brick-bread** ['brɪkbred] *n* kərpic formalı çörək
**brick-earth** ['brɪkə:θ] *n* kərpic kəsmək üçün palçıq
**brick-field** ['brɪkfi:ld] *n* kərpic zavodu
**brick-kiln** [brɪkkɪln] *n* kərpic bişirmək üçün soba / peç
**bricklayer** ['brɪkˌleɪə$^r$] *n* bənna, kərpic hörən bənna
**brick-setter** ['brɪkˌsetə$^r$] *n* = **bricklayer**
**brickwork** ['brɪkwə:k] *n* kərpiclə hörmə / tikmə
**brickworks** ['brɪkwə:ks] *n* kərpic zavodu
**bricky** ['brɪkɪ] *adj* 1. kərpicdən düzəldilmiş; 2. kərpic rəngli
**brick-yard** ['brɪkja:d] *n* kərpic zavodu
**bridal**[1] ['braɪdl] *n şair.* toy mərasimi/qonaqlığı; toy
**bridal**[2] ['braɪdl] *adj* toy; **~ banquet** toy qonaqlığı; **~ party** qız evindən gəlmiş qonaqlar
**bride** [braɪd] *n* gəlin; *Here comes the bride, all dressed in white Budur başdan-ayağa ağ libas geyinmiş gəlin gəlir (toy mahnısından)*
**bride-cake** ['braɪdkeɪk] *n* toy üçün bişirilmiş piroq
**bride-couple** ['braɪdˌkʌpl] *n* yeni evlənmiş ər-arvad
**bridegroom** ['braɪdgrum] *n* 1. nişanlı/adaxlı *(oğlan)*; evlənmək istəyən adam, evlənmək yaşına çatmış oğlan; 2. yeni evlənmiş kişi
**bridehouse** ['braɪdhaus] *n* toy evi; toy olan ev
**brideman** ['braɪdmən] *n* = **bridesman**
**bridesmaid** [braɪdzmeɪd] *n* gəlinin rəfiqəsi /dostu
**bridesman** ['braɪdzmən] *n (pl* **-men** [-mən]*)* sağdış, soldış
**bridewell** ['braɪdwəl] *n* islahedici həbsxana /ev
**bridge**[1] [brɪdʒ] *n* I 1. körpü; **to throw a ~** körpü salmaq; 2. bənd; 3. çəpər; 4. körpücük; 5. burunun üst hissəsi; 6. xərək *(musiqi alətlərində simlərin altına qoyulan taxta və ya sümük parçası)*; 7. körpü *(süni dişlər üçün)*;
◊ **to burn *one's* ~s** ≅ oturduğu budağı kəsmək, özünü çətin/çıxılmaz vəziyyətə salmaq; *Don't cross the bridges before you come to them at. söz.* ≅ çay gəlməmiş keçmək üçün çırmanma
**bridge** [brɪdʒ] *n* II bric *(qumar oynunun bir növü)*
**bridge**[2] [brɪdʒ] *v* 1. körpü salmaq/tikmək; **to ~ a river** çay üzərindən körpü salmaq /tikmək; 2. aradan / ortadan qaldırmaq; **to ~ over the difficulties** çətinliyi ortadan / aradan qaldırmaq;
◊ **to ~ a gap** uyğunsuzluğu aradan qaldırmaq
**bridgemaster** ['brɪdʒˌma:stə$^r$] *n* körpü gözətçisi
**bridle**[1] ['braɪdl] *n* 1. yüyən; **to give a horse the ~** 1) atın yüyənini buraxmaq; 2) tam azadlıq vermək; **to put a ~ on *smb.*** bir kəsin hərəkətinə məhdudiyyət qoymaq; *She must put a bridle on her tongue O, dilini saxlamalıdır / sözünə sərhəd qoymalıdır;*
◊ **to turn ~** geri dönmək, gəldiyi yerə qayıtmaq
**bridle**[2] ['braɪdl] *v* 1. cilovlamaq, yüyənləmək; 2. cilovunu çəkmək, qarşısını almaq, həddini bildirmək /göstərmək; **to ~ *one's* passions** ehtirasını cilovlamaq; 3. burnunu yuxarı tutmaq, lovğalanmaq, iddia satmaq, təkəbbürlənmək, təşəxxüs satmaq, özünü çəkmək; 4. özündən çıxmaq, hiddətlənmək, qeyzlənmək
**bridle-hand** ['braɪdlhænd] *n* atlının sol əli
**bridle-path** ['braɪdlpa:θ] *n* at yolu / cığırı
**bridle-rein** ['braɪdlreɪn] *n* cilov, yedək
**bridoon** [brɪ'du:n] *n* qantarğa, çaralğa
**brief**[1] [bri:f] *n* I 1. ifadə, xülasə, şərh, izah; şərh / izah / ifadə etmə; 2. məlumat, məlumat vərəqəsi; 3. *hüq.* işin yazılı şəkildə qısa xülasəsi; 4. *hüq.* iş; klient; **to take a ~** işi məhkəmə prosesində aparmaq üçün qəbul etmək; 5. *mar.* müdafiə etmək *(bir kəsi)*; **to have plenty of ~s**

böyük təcrübəsi olmaq *(vəkillik işində)*; **6.** *hərb.* döyüşə getməzdən əvvəl təyyarəçiyə verilən təlimat

**brief** [bri:f] *n* II: in ~ qısası; It's a long letter, but in brief he says "No" Məktub uzundur qısası o, "Yox" deyir

**brief**[2] [bri:f] *adj* (-er, -est) 1. qısa, sürəksiz, ötəri, qısamüddətli; ~ **review** qısa xülasə/ icmal; **a ~ look at the newspaper** qəzetə ötəri baxış; **a ~ letter** qısa məktub; 2.: **in a ~** qısası; *It's a long letter, but in brief, he says "No" Bu uzun məktubdur, lakin qısası "Yox" deyir;* 3.: **~ and to the point** *(söhbət və yazı haq.)*; qısa və məqsədyönlü; *The letter was brief and to the point Məktub qısa və məqsədyönlü idi;*

**brief**[3] [bri:f] *v* 1. qısa ifadə etmək; xülasə etmək, yekun vurmaq, yekunlaşdırmaq; 2. *hüq.* 1) vəkilə təlimat vermək; 2) işi aparmağı vəkilə həvalə etmək /tapşırmaq; 3. ətraflı məlumat / xəbər vermək; 4. təlimat vermək *(təyyarəçiyə döyüşə getməzdən əvvəl /öncə)*; 5. nağıl etmək, danışmaq

**brief-bag** ['bri:fbæg] *n* = **brief-case**

**brief-case** ['bri:fkeis] *n* portfel

**briefing**[1] ['bri:fiŋ] *n* 1. təlimat / göstəriş vermə; **to give a ~** təlimat /göstəriş vermək üçün iclas; *Before the meeting, let me give you a briefing; İclasdan əvvəl gəl/ gəlin sənə / sizə göstəriş verim;* 2. təlimat, göstəriş

**briefing**[2] ['bri:fiŋ] *adj:* ~ **meeting** təlimat iclası, göstəriş vermək üçün iclas

**briefless** ['bri:flis] *adj* təcrübəsiz, müştərisiz *(vəkil haq.)*

**briefly** ['bri:fli] *adv* qısa, qısaca, müxtəsər, müxtəsərcə; yığcam, yığcamca, qısa / yığcam tərzdə

**briefness** ['bri:fnis] *n* qısalıq, müxtəsərlik, yığcamlıq, gödəklik

**briefs** [bri:fs] *n pl* şortı *(dizə qədər olan qısa və bədənə yapışan şalvar)*

**brier** ['braiə(r)] *n* 1. *bot.* itburnu; 2. *top.i* pöhrəlik, kolluq, cəngəllik

**brig** [brig] *n* 1. ikidorlu gəmi; 2. qauptvaxta *(hərbi qulluqçular üçün dustaqxana)*

**brigade** [bri'geid] *n* 1. briqada; komanda; dəstə; **the Fire Brigade** yanğınsöndürən briqada; 2. *hərb.* briqada *(5.000 əsgərdən ibarət hərbi bölmə)*

**brigadier** [ˌbrigə'diə(r)] *n hərb.* 1. briqadir *(Böyük Britaniya ordusunda)*; 2. *amer.* = **brigadier-general**

**brigadier-general** ['brigədiə'dʒenərəl] *n* briqada generalı *(ABŞ ordusunda)*

**brigand** ['brigənd] *n* quldur, yolkəsən, çapqınçı, soyğunçu, bandit

**brigandage** ['brigəndidʒ] *n* quldurluq, qarət, soyğunçuluq, talan, çapqınçılıq, banditizm

**brigandine** ['brigəndain] *n tar.* zireh, zirehli geyim

**bright**[1] [brait] *n* parlaqlıq, işıqlılıq, işıq

**bright**[2] [brait] *adj* (-er, -est) 1. parlaq; işıqlı; aydın; ~ **star** işıqlı/parlaq ulduz; ~ **colours** parlaq rənglər; ~ **day** parlaq/aydın gün; ~ **red** tünd qırmızı; ~ **eyes** parlaq/aydın gözlər; ~ **future** parlaq/işıqlı gələcək; ~ **sound/voice** aydın səs; *The sun is brighter than the moon Günəş aydan daha işıqlıdır;* **one of the ~est moments in our country's history** ölkəmizin tarixində ən parlaq səhifələrindən biri; 2. şəffaf/dupduru/saf; ~ **wine** şəffaf/dupduru/saf şərab; 3. cilalanmış, parlaqlaşdırılmış; 4. çox yaxşı /gözəl; ~ **plan /reply** çox gözəl plan/cavab; 5. bacarıqlı, fərasətli, anlaqlı, düşüncəli, zəkalı, fəhmli, tez başa düşən; ~ **boy** bacarıqlı/zəkalı/düşüncəli/fərasətli oğlan; 6. şən, şad, oynaq, şux, qızğın, fəal; optimist; **to keep ~ in spite of *one's* misfortune** bədbəxtliyə baxmayaraq öz şuxluğunu saxlamaq

**bright**[3] [brait] *adv* = **brightly**

**brighten** ['braitn] *v* 1. açılmaq, aydınlaşmaq; *The sky is brightening Səma açılır/ aydınlaşır;* 2. sevindirmək; 3. təmizləmək; parıldatmaq *(metalı)*; 4. bəzəmək; *These flowers brighten the room Bu çiçəklər otağa zinət verir/otağı bəzəyir*

**brightly** ['braitli] *adv* parlaq *(surətdə)*, aydın, açıq

**brightness** ['braitnis] *n* parlaqlıq; aydınlıq, açıqlıq

**Bright's Disease** ['braitsdi'zi:z] *n tib.* böyrək soyuqlaması

**brill** [bril] *n zool.* kambala, qalxan balığı

**brilliance** ['briljəns] *n* 1. parlaqlıq, parıltı; **the ~ of the lamp** lampanın parlaqlığı; 2. calal, dəbdəbə, təmtəraq, əzəmət; parlaqlıq; ~ **of mind** zəkanın parlaqlığı/əzəməti

**brilliancy** ['briljənsi] *n* = **brilliance**

**brilliant**[1] ['briljənt] *n* brilyant

**brilliant**[2] ['briljənt] *adj* parlaq, parlayan, işıqlı; gözqamaşdırıcı; ~ **sunshine** gözqamaşdırıcı /parlaq günəş işığı; ~ **polish** parıldayan cila; ~ **mind** parlaq zəka; ~ **wit** parlaq ağıl

**brilliantly** [briljəntli] *adv* parlaq bir tərzdə, parlaq surətdə, parlaqlıqla

**brilliantine** [ˌbriljən'ti:n] *n* brilyantin *(saça sürtülən ətirli yağ)*

**brim**[1] [brim] *n* 1. qıraq, kənar *(şlyapada)*; 2. ağız; **full to the ~** ağzına qədər dolu; *The bucket is full to the brim Vedrə ağzına qədər doludur*

**brim**[2] [brim] *v* (-mm-) 1. ağzına qədər doldurmaq; 2. dolmaq, ağzına qədər dolmaq; *Her eyes brimmed (over) with tears Onun gözləri yaşla doldu*

**brimful** ['brimfl] *adj* 1. ağzına qədər dolu; **to fill a glass ~** stəkanı ağzına qədər doldurmaq; *She filled the bowl brimful with sugar O, qənddanı qəndlə ağzına qədər doldurdu;* 2. dolu; *Her eyes were brimful of tears Onun gözləri yaşla dolu idi; He was brimful of suggestions Onun bir aləm yeni təklifi vardı*



**brimless** ['brimlis] *adj* qıraqsız, qırağı olmayan *(şlyapa)*

**brimmed** ['brimd] *adj* 1. ağzına qədər doldurulmuş; 2. qırağı olan, qıraqlı *(şlyapa haq.)*

**brimmer** ['brimə(r)] *n* ağzına qədər doldurulmuş qədəh / bokal

**brimstone** ['brimstoun] *n* saf/xalis kükürd;
◊ **fire and ~** cəhənnəm odu

**brindled** ['brindld] *adj* zolaqlı; xallı *(inək, pişik və s. haq.)*

**brine**[1] [brain] *n* 1. şor / duzlu su; duzluq; 2. rapa *(tərkibində müxtəlif duzlar olan və müalicə üçün istifadə edilən göl suyu)*; 3. *şair.* dəniz, okean; okeanın/dənizin suyu; 4. *şair.* göz yaşı

**brine**[2] [brain] *v* duza qoymaq, duzlamaq; duzlu suya salmaq

**brine-bath** ['brainba:θ] *n* duzlu vanna *(müalicə məqsədilə istifadə edilən)*

**brinespring** ['brain.spriŋ] *n* duzlu çeşmə/qaynaq

**bring** [briŋ] *v (pt, pp* **brought** [brɔ:t]*)* 1. gətirmək; *Bring me the book Kitabı mənə gətir / gətirin; Bring your friend to the party Dostunu/Dostunuzu qonaqlığa gətir /gətirin; What brings you here today? Səni/Sizi bu gün bura nə gətirib?;* 2. səbəb / bais olmaq, törətmək, doğurmaq, oyatmaq; *This sad news brought tears to her eyes Bu qəmli xəbər onun gözlərinin yaşla dolmasına səbəb oldu;* 3. çatdırmaq; **to ~ water to the boil** suyu qaynama dərəcəsinə çatdırmaq; **to ~ to ruin** xaraba vəziyyətinə salmaq, dilənçi kökünə / halına salmaq; **to ~ to market** bazara çıxarmaq; **to ~ a criminal to justice** *hüq.* cinayətkarı məhkəməyə vermək; **to ~ *smb.* to disgrace** bir kəsi biabır etmək; **to ~ to an end/to close** sona/başa çatdırmaq; **to ~ into fashion** dəbə salmaq; **to ~ into action** 1) hərəkətə gətirmək, işə salmaq; 2) cəbhəyə atmaq; 4. gəlir gətirmək/vermək; *The goods brought low prices Mal aşağı qiymətə satıldı; His literary work brings him but a small income Onun ədəbi işi ona az gəlir gətirir;* 5. qaldırmaq *(iş)*; **to ~ an action against *smb.*** bir kəsə qarşı iş qaldırmaq; 6. təqdim etmək; irəli sürmək *(iddia, şikayət, sübut)*; **to ~ charges against a person** bir şəxsə qarşı ittiham irəli sürmək/qaldırmaq; 7. inandırmaq, vadar / məcbur etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir iş görməyə məcbur etmək; *I cannot bring myself to believe Mən özümü inandıra bilmirəm;* **to ~ *smb.* to his sense** bir kəsin ağlını başına gətirmək; *The feeling of coldness brought him to himself Soyuqluq hissi onu ayıltdı;* **to ~ *smth.* to a stand/a halt** bir şeyi dayandırmaq; **to ~ a motor-car to a halt** maşını dayandırmaq / saxlamaq;
◊ **to ~ to account** məsuliyyətə cəlb etmək, izahat tələb etmək; izahat istəmək; **to ~ to book** 1) = **to ~ to account**; 2) araşdırmağa/yoxlamağa/tədqiq etməyə başlamaq; **to ~ to light** aşkar/müəyyən etmək, üstünü açmaq; **to ~ to naught** 1) heçə/yoxa çıxartmaq; 2) var-yoxdan çıxartmaq, iflasa səbəb olmaq; məhv etmək; **to ~ to a hammer** hərraca qoymaq; **to ~ into being** yaratmaq, həyata gətirmək, həyat vermək; **to ~ into line** bir cərgəyə qoymaq, fikir birliyinə nail olmaq; **to ~ the water to *smb.'s* mouth** bir kəsin ağzını sulandırmaq/iştahasını açmaq; **to ~ oil to the fire** ocağa yağ tökmək *(aranı qızışdırmaq)*; **to ~ about** səbəb olmaq; *Science has brought about many changes in our lives Elm bizim həyatımızda çox dəyişiklərə səbəb olub;* **to ~ around** fikrini dəyişdirməyə təhrik etmək; *We must bring him around to our point of view Biz onu təhrik etməliyik ki, o bizim fikrimizlə razılaşsın;* **to ~ back** qaytarmaq, qaytarmağa məcbur etmək; *All library books must be brought back before June Kitabxana kitabları iyun ayının 20-sinə kimi geri qaytarılmalıdır; Bring us back our books, please Zəhmət olmasa, bizim kitablarımızı bizə qaytar/ qaytarın;* **to ~ down** 1) endirmək; enmək; *The pilot brought the plane down gently Pilot təyyarəni ehmalca endirdi;* 2) enməyə məcbur etmək; **to ~ a plane with gunfire** təyyarəni atəşlə yerə enməyə məcbur etmək; 3) vurub yıxmaq; yerə sərmək, öldürmək; *He brought the deer down with one shot O, maralı bir güllə ilə yerə sərdi / vurub yıxdı;* 4) azaltmaq, aşağı salmaq *(qiymətləri)*; **to ~ the price** qiyməti aşağı salmaq; **to ~ on** 1) səbəb olmaq; *Going out in the rain brought on a fever Yağışda çölə çıxmaq qızdırmaya səbəb oldu; This warm weather will bring on the crops Bu mülayim hava yaxşı məhsul almağa səbəb olacaq;* 2) kömək etmək; *More study should bring you on in English Çox işləmək sənin / sizin ingilis dilini öyrənməyinə / öyrənməyinizə kömək edəcək;* **to ~ out** 1) istehsal etmək; **to ~ out a new kind of soap** yeni növ sabun istehsal etmək; 2) üzə çıxarmaq; *Difficulties can bring out a person's best qualities Çətinliklər insanın ən yaxşı keyfiyyətlərini üzə çıxara bilər;* 3) aşkar etmək; **to ~ the meaning out** mənanı aşkar etmək; **to ~ round** özünə gətirmək; *Tom has fainted: try to bring him round Tom huşunu itirib: çalış/çalışın onu özünə gətir/gətirin;* **to ~ through** xilas etmək *(ağır xəstəni)*; *Can the doctor bring Mother through? Həkim anamızı xilas edə biləcəkmi? The people's courage brought them through the war İnsanların cəsarəti onları müharibədən sağ çıxartdı;* **to ~ together** görüşdürmək, yaxınlaşdırmaq; *I'm so glad to have been the means of bringing you two together Mən çox şadam ki, sizin ikinizi görüşdürməyə vasitəçi oldum;* **to ~ up** 1) böyütmək, tərbiyə etmək/vermək; **to ~ children** uşaqları

böyütmək/tərbiyə etmək; 2) qusmaq/ qaytarmaq; *He brought up his dinner O, yediyini qusdu/qaytardı;* **to ~ up against** əleyhinə çevirmək; *Your prison record may be brought up against you Sənin/Sizin həbs protokolun/protokolunuz sənin/sizin əleyhinə / əleyhinizə çevrilə bilər;*
◊ *Spring rains bring summer flowers ≅ Yaz yağışı bar gətirər*

**brink** [brıŋk] *n* **1.** konar, qıraq *(uçurumun, sıldırımın, yarğanın)*; **2.** sərhəd, hüdud; dərəcə, həd, kənar; **to be on the ~ of ruin** dilənçilik / səfalət həddində olmaq; **to be on the ~ of grave** bir ayağı gorda olmaq; **to be on the ~ of tears** ağlamaq həddində / dərəcəsində olmaq; *His failures brought him to the brink of ruin Uğursuzluqları onu səfalət həddinə çatdırdı;* **to be on ~ of war** müharibə həddində olmaq;
◊ **to stand shivering on the ~** tərəddüd etmək, qərarsızlıq göstərmək

**brinkmanship** [ˈbrıŋkmənʃıp] *n* müharibə həddində müvazinət saxlama; **policy of ~** müharibə həddində müvazinət siyasəti

**briny** [ˈbraını] *adj* **1.** çox duzlu, qır duz; **2.** *şair.* acı; **~ tears** acı göz yaşları; **to shed ~ tears** acı göz yaşları axıtmaq/tökmək

**brisk**[1] [brısk] *adj* **(-er, -est) 1.** diri, diribaş, çevik, zirək, qıvraq; cəld; **a ~ old man** diribaş/zirək/çevik/qıvraq qoca; **a ~ walker** cəld yeriyən; **a ~ walk** cəld yeriş; **2.** qızğın, canlı; **~ trade** qızğın ticarət; **3.** parlaq; **~ fire 1)** parlaq od / işıq; **2)** *hərb.* intensiv atəş; **at a ~ pace** iti/iri addımla; **4.** təzə, sərin *(xüs. külək, hava və s. haq.)*; **~ morning air** sərin təzə səhər havası; **5.** qazlı, qaynayan, fışıldayan *(içki haq.)*

**brisk**[2] [brısk] *v* **(up)** canlandırmaq; **to ~ up a fire** ocağı üfürmək/yelləyib qızışdırmaq; **to ~ up one's pace** addımını tezləşdirmək

**briskly** [ˈbrıskli] *adv* cəld, çevik, çeviklikla, zirək, zirək bir tərzdə; **to walk ~** cəld yerimək

**briskness** [ˈbrısknıs] *n* cəldlik, zirəklik, diribaşlıq, çeviklik

**brisket** [ˈbrıskıt] *n* **1.** *anat.* sinə sümüyü; **2.** *aşp.* döş əti *(heyvanlarda)*

**brisling** [ˈbrısliŋ] *n* şprot *(yağda konservləşdirilmiş xırda balıqlar)*

**bristle**[1] [ˈbrısl] *n* **1.** qıl, cod tük; *His face was covered with bristles Onun üzünü qıl basmışdı;* **2.** kəndir, çətənə lifi;
◊ **to set up one's ~s** tüklərini qabartmaq; hirslənmək, acıqlanmaq

**bristle**[2] [ˈbrısl] *v* **1.** tüklərini qabartmaq / pırpızlaşdırmaq; tükləri biz-biz olmaq; *His hair bristled with anger Acıqdan / Hirsdən onun tükləri biz-biz oldu; Don't bristle up like a hedgehog Kirpi kimi tüklərini/tüklərinizi qabartma/qabartmayın;* **2.** acıqlanmaq, acığı tutmaq; **3. (with)** bol olmaq; dolu olmaq; *The plan bristles with technical difficulties Plan texniki çətinliklərlə doludur*

**bristly** [brısli] *adj* **1.** cod, sərt *(tük)*; *This brush is bristly, please give me a soft one Bu şotka çox coddur, zəhmət olmasa, mənə yumşağını ver/verin;* **2.** çılğın, hövsələsiz, çətin *(adam haq.)*

**Briticism** [ˈbrıtısızm] *n* **1.** anqlisizm *(ingilis dilindən alınmış söz və ya ifadə)*; **2.** tipik ingilis xüsusiyyəti *(xasiyyətdə və s.)*

**British**[1] [ˈbrıtıʃ] *n* ingilislər, britaniyalılar; *The British drink a great deal of tea İngilislər çox çay içirlər*

**British**[2] [ˈbrıtıʃ] *adj* Britaniya, ingilis; **the ~ Museum** Britaniya muzeyi; **the ~ English** ingilis dilinin Britaniya variantı; **a ~ citizen** Britaniya vətəndaşı

**Britisher** [ˈbrıtıʃəʳ] *n amer.* ingilis, britaniyalı, Britaniya vətəndaşı / təbəəsi

**Britishism** [ˈbrıtıʃızm] *n* = **Briticism**

**Briton** [ˈbrıtn] *n* **1.** britaniyalı, ingilis; **North ~** şotlandiyalı; **2.** *tar.* brits, britlər *(İngiltərənin qədim əhalisi - keltlər)*

**brittle** [ˈbrıtl] *adj* **1.** kövrək, tezsınan; **a ~ glass** kövrək/tezsınan şüşə; **2.** çox zərif/ incə, tez pozula bilən; **a ~ friendship** tezpozulan/çox incə dostluq; **a ~ nature** çox zərif təbiət; **a ~ agreement** tez pozula bilən razılıq

**brittleness** [ˈbrıtlnıs] *n* kövrəklik; zəriflik, incəlik; tezsınma, davamsızlıq

**brittle willow** [ˈbrıtlˈwılou] *n bot.* keçisöyüdü *(tezsınan söyüd)*

**broach**[1] [broutʃ] *n* **1.** şiş; **2.** *tex.* dartıb nazikləşdirmə; **3.** burma; burub açma/boşaltma/genəltmə

**broach**[2] [broutʃ] *v* **1.** deşmək, deşik açmaq; *He was cruelly broached to death with a dagger Onu xəncərlə ölümcül halda deşik-deşik etmişdilər;* **2.** elan etmək *(ucadan)*; **3.** açmaq *(butulkanı)*; mayeni boşaltmaq üçün kran qoymaq *(çəlləyə)*; **4.** müzakirə etməyə başlamaq *(məsələni)*; *We broached the third point Biz üçüncü bəndi müzakirə etməyə başladıq;* **to ~ smth.** bir şey haqqında məsələ qaldırmaq, hər-hansı bir mövzu üzrə müzakirə açmaq; **5.** yonmaq *(daşı)*

**broad**[1] [brɔ:d] *n* **1.** enli hissəsi *(kürəyin, söykənəcəyin)*; **2.** *amer.* gənc qadın / qız

**broad**[2] [brɔ:d] *adj* **(-er, -est) 1.** enli, geniş; **~ chest** enli sinə/ köks; **~ shoulders** enli çiyinlər; **a ~ river** enli çay; **~ fields** geniş çöllər; **in a ~ sense** geniş mənada; *In a broad sense it is true Geniş mənada bu doğrudur;* **2.** aydın, açıq; **~ purpose** açıq/ aydın məqsəd; **~ statement** açıq bəyanat; **~ hint** aydın/ açıq eyham; **3.** nəzərəçarpan, açıq, güclü *(aksent haq.)*; **~ Scotch accent** açıq / nəzərəçarpan şotland aksenti; **4.** ümumi, əsas *(xüsusiyyət haq.)*; **a ~ outline of the plan** planın geniş qaralama variantı; **5.** kobud, qaba, ədəbsiz, nalayiq, yaraşmaz; **~ joke** kobud/ədəbsiz/ nalayiq zarafat; **~ story** nalayiq/yaraşmaz/ədəbsiz lətifə



**broad**[3] [brɔ:d] *adv* **1.** geniş, geniş surətdə / tərzdə; **2.** sərbəst, açıq; **3.** tamamilə, tam, lap; **~ awake** yuxudan tam/tamamilə ayılmış; **4.** aydın nəzərə çarpan, aydın hiss edilən; **to speak ~** aydın hiss olunan aksentlə danışmaq

**broad-brim** [ˈbrɔ:dbrım] *n* yanları enli şlyapa

**broadcast**[1] [ˈbrɔ:dka:st] *n* **1.** veriliş *(yayım)*; **television ~** televiziya verilişi/yayımı; **wire ~** radio translyasiya; **2.** radioverilişi

**broadcast**[2] [ˈbrɔ:dka:st] *adj* radioveriliş; **~ time** radioveriliş vaxtı; **~ appeal** radio ilə müraciət

**broadcast**[3] [ˈbrɔ:dka:st] *v* radio və televiziya vasitəsilə xəbər vermək; radioverilişi aparmaq; *The BBC will broadcast the news at 10 o'clock BBC xəbərləri saat 10-da verəcək; The concert is being broadcast live Konsert canlı yayımlanır;* **2.** yaymaq, xəbər vermək; *He broadcast the news to all his friends O, xəbəri bütün dostlarına yaydı*

**broadcaster** [ˈbrɔ:dka:stəʳ] *n* **1.** diktor; **2.** radio-/televiziya proqramları şirkəti

**broadcasting** [ˈbrɔ:dka:stıŋ] *n* radioverilişi, translyasiya

**Broadcasting-House** [ˈbrɔ:dka:stıŋˈhaus] *n* Londonda BBC-nin yerləşdiyi bina

**broadcasting station** [ˈbrɔ:dka:stıŋˈsteıʃn] *n* radio/televiziya verilişləri stansiyası

**broaden** [ˈbrɔ:dn] *v* genişləndirmək; genişlənmək; **to ~ one's outlook** biliyini/görüş dairəsini genişləndirmək; *Travel broadens the mind Səyahət idrakı genişləndirir; The river broadens (out) at this place Çay bu yerdə genişlənir*

**broad-faced** [ˈbrɔ:dfeıst] *adj* enlisifət, enlisifətli, enliüz, enliüzlü

**broadgauge** [ˈbrɔ:dˈgeıdʒ] *n d.y.* geniş *(yəni normaya uyğun)* dəmir yolu

**broad-guade** [ˈbrɔ:dgeıd] *adj* **1.** *d.y.* enli xətli *(dəmir yolu haq.)*; **2.** geniş, hərtərəfli *(məsələyə yanaşma haq.)*; **3.** liberal *(barışdırıcı, güzəştə gedən)*

**broad irrigation** [ˈbrɔ:d.ırıgeıʃn] *n k.t.* üzdən suvarma

**broad jump** [ˈbrɔ:dˈdʒʌmp] *n id.* uzununa hoppanma / tullanma

**broad-leaved** [ˈbrɔ:dˈli:vd] *adj bot.* enliyarpaq, enliyarpaqlı; **~ trees** enliyarpaq ağaclar

**broadly** [ˈbrɔ:dlı] *adv* **1.** geniş, geniş surətdə /tərzdə; *Broadly speaking... Ümumiyyətlə desək...;* **2.** açıq, açıq-aydın, açıqdan-açığa, açıqcasına, heç bir şey gizlətmədən, düz; qətiyyətlə; *He looked at me broadly in the face O, qətiyyətlə/düz mənim üzümə baxdı;* **to talk ~** açıq /açıq-açığına/ heç bir şey gizlətmədən danışmaq; **3.** aksentlə; **to speak Russian ~** rusca aksentlə danışmaq

**broad-minded** [ˈbrɔ:dˈmaındıd] *adj* geniş dünyagörüşlü, genişfikirli; dözümlü

**broad-mindedly** [ˈbrɔ:dˈmaındıdlı] *adv* geniş dünyagörüşünə malik surətdə/tərzdə, ətraflı, geniş

**broad-mindedness** [ˈbrɔ:dˈmaındıdnıs] *n* geniş dünyagörüşünə malik olma; dözümlülük

**broadness** [ˈbrɔ:dnıs] *n* **1.** en; **2.** kobudluq, qabalıq *(zarafatda, danışıqda)*

**broadseal** [ˈbrɔ:dsi:l] *n* böyük dövlət möhürü

**broadsheet** [ˈbrɔ:dʃi:t] *n* **1.** bir və ya hər iki tərəfi yazılmış və qatlanmış böyük kağız vərəqi; **2.** böyük kağız vərəqinə yazılmış bir şey *(elan və s.)*, plakat

**broadside** [ˈbrɔ:dsaıd] *n* **1.** gəminin suyun üstündə qalan bortu *(kənarı)*; **2.** gəminin bir bortundan açılan atəş; **to give ~** gəminin bortundan atəş açmaq; **3.** işıqverən lampa *(kinoaparatda)*

**broadstone** [ˈbrɔ:dstən] *n tik.* piltə, tava daşı, yastı daş

**broadsword** [ˈbrɔ:dsɔ:d] *n* **1.** qəmə, gorda; **2.** *pl* qəmə ilə silahlanmış əsgərlər

**Broadway** [ˈbrɔ:dweı] *n* Brodvey *(Nyu-Yorkda teatrların, universal müəssisələrin və s. yerləşdiyi küçə)*

**broadwife** [ˈbrɔ:dwaıf] *n (pl* **-wives***) amer. tar.* başqa sahibə mənsub olan qul arvadı

**broadwise** [ˈbrɔ:dwaız] *adj* eninə, boyuna, köndələninə

**brocade**[1] [brəˈkeıd] *n* zərxara

**brocade**[2] [brəˈkeıd] *adj* zərxara; **~ gown** zərxaradan tikilmiş don

**brocaded** [brəˈkeıdıd] *adj* zərxara, zərxaradan tikilmiş, zərxara ilə bəzədilmiş

**brochure** [ˈbrouʃjuəʳ] *n* kitabça, broşür

**brock** [brɔk] *n* **1.** *zool.* porsuq; **2.** alçaq, əclaf, namərd

**broil**[1] [brɔıl] *n* **I** dalaşma, vuruşma, qovğa, dava; səs-küy, qalmaqal; söyüş; **to fight in every ~** hər bir davada / qalmaqalda iştirak etmək

**broil** [brɔıl] *n* **II** isti, istilik, hərarət; **2.** açıq odda qızardılmış ət və ya balıq

**broil**[2] [brɔıl] *v* **I** dalaşmaq, savaşmaq, söyüşmək, küsüşmək

**broil** [brɔıl] *v* **II 1.** açıq odda qızartmaq; açıq odda qızarmaq; **2.** *d.d.* günəşdə yanmaq; **3.** bərk isti olmaq; *It's really broiling today Bu gün həqiqətən bərk istidir; I'm broiling in this hot sun Mən bu isti gündə bişirəm; I really got broiled beside the sea yesterday Mən dünən dəniz kənarında həqiqətən yanmışam/bişmişəm*

**broiler** [ˈbrɔıləʳ] *n* **I** *d.d.* davakar *(adam)*, dalaşqan *(adam)*, sataşqan *(adam)*

**broiler** [ˈbrɔıləʳ] *n* **II 1.** raşper *(cücə və s. qızartmaq üçün soba)*; **2.** broyler *(qızartmaq üçün cücə)*; **3.** çox/bərk isti gün

**broiling** [ˈbrɔılıŋ] *adj* isti, qaynar, bərk isti, qızmar; **a ~ day** qızmar gün; *It was a broiling day Qızmar bir gün idi*

**brokage** [ˈbroukıdʒ] *n* **1.** rüşvət *(vəzifə almaq üçün verilən)*; **2.** vasitəçilik, aradüzəltmə, oğraşlıq; elçilik, elçi göndərmə

**broke**[1] [brouk] *adj* **1.** müflisləşmiş, var-yoxdan çıxmış; **to be dead/stony ~** tam şəkildə müflisləşmək/var-yoxdan çıxmaq; *He is flat/dead/stony broke O tamamilə var-yoxdan çıxmışdır;* **to be ~ to the world** bir qəpiyi olmamaq; **to go ~** var-yoxdan çıxmaq, diləncі halına düşmək, müflisləşmək; *His firm has gone broke Onun firması tam müflisləşmişdir;* **2.** *amer.* təlim verilmiş, yerişə öyrədilmiş *(at haq.); The horse is thoroughly broke At yaxşı öyrədilmişdir*

**broke**[2] [brouk] *v* dəllallıq etmək

**broke**[3] [brouk] **to break** *felinin pt formasi*

**broken**[1] ['broukən] *adj* **1.** sınmış, sındırılmış, qırıq, qırılmış, sınıq; **~ cup** sınıq / sınmış / sındırılmış fincan; **~ leg** qırılmış / sınıq qıç; **~ stone** çınqıl, qırma daş, şebən; **2.** korlanmış, pozulmuş; **a ~ marriage** pozulmuş kəbin; **3.** sarsıdılmış *(sağlamlıq haq.)*; **4.** kələ-kötür, nahamar *(torpaq haq.)*; **~ ground 1)** əkilmiş torpaq; **2)** kələ-kötür yer; **~ fields 1)** kələ-kötür / nahamar çöllər; **2)** əkilmiş sahələr; **5.** pozulmuş, yerinə yetirilməmiş; **a ~ law** pozulmuş qanun; **a ~ promise** yerinə yetirilməmiş vəd; **~ dreams** başa çatmamış arzular; **6.** dağılmış; **a ~ home** dağılmış ev; **7.** yarımçıq qalmış / başa çatmamış *(səyahət haq.)*; **8.** pozuq *(dil haq.)*; **~ English** pozuq ingilis dili; *He speaks broken English O, pozuq ingilis dilində danışır;* **9.** yerişə öyrədilmiş *(at haq.)*; **10.** dəyişkən, tez-tez dəyişən *(hava haq.)*; **11.** qalıq; **~ bread** çörək qalığı / qırığı;

◊ **~ money** xırda pul; **~ reed 1)** davamsız şey; **2)** zəif/etibarsız adam; **~ time** işsiz dayanma, boşdayanma; **payment for ~ time** işsiz dayanma üçün əmək haqqı; **~ water** ləpədöyən

**broken**[2] ['broukən] **to break** *felinin pp formasi*

**broken-down** ['broukən'daun] *adj* **1.** əldən düşmüş, üzgün *(xəstəlikdən)*; **2.** taqətdən salınmış *(dərddən, kədərdən və s.)*; **3.** köhnə, sıradan /istifadədən çıxmış *(maşın və s.)*; **a ~ old car** köhnə sınıq-salxaq maşın

**broken-hearted** ['broukən'ha:tıd] *adj* ürəyisınıq, qəlbiqırıq, kədərli, dərdli; dərdə / kədərə düçar; **a ~ woman** dərdli / kədərli qadın

**broken-heartedly** ['broukən'ha:tıdlı] *adv* dərdli, kədərli, ruhdan düşmüş tərzdə/ halda

**broken-wind** ['broukənwınd] *n bayt.* xəfənək *(at və başqa heyvanlarda ciyər xəstəliyi)*

**broken-winded** ['broukən'wındıd] *adj bayt.* **1.** sancılanmış; sürülüb əldən salınmış *(at haq.)*; **2.** xəfənəkli *(at və başqa heyvanlar haq.)*

**broker** ['broukə^r] *n* **1.** broker, makler, dəllal; **2.** aradüzəldən; **3.** tutulmuş/saxlanılmış şeyləri satan adam

**brokerage** ['broukərıdʒ] *n* **1.** dəllallıq; **2.** dəllal / dəllallıq haqqı

**broking** ['broukıŋ] *n* **1.** dəllal/dəllallıq işi; **2.** vasitəçilik; aradüzəltmə

**brolly** ['brɔlı] *n d.d.* çətir, zontik

**bromic** ['broumık] *adj kim.* bromlu

**bromine** ['broumın] *n kim.* brom

**bronchial** ['brɔŋkıəl] *adj* bronxial; **~ disease** bronxial xəstəlik; **~ tube** bronxial boru; **~ asthma** bronxial astma

**bronze**[1] [brɔnz] *n* **1.** tunc; **2.** tuncdan qayrılmış / hazırlanmış şeylər; **3.** tunc tozu; **4.** tunc rəngi, qırmızıtəhər-palıdı rəng; **5.** top istehsalı üçün metal

**bronze**[2] [brɔnz] *adj* **1.** tunc; **2.** tuncdan qayrılmış/hazırlanmış; **~ ornaments** tuncdan qayrılmış bəzək şeyləri; **3.** qırmızıtəhər-palıdı;

◊ **~ age** tunc dövrü

**bronze**[3] [brɔnz] *v* **1.** tunc çəkmək, tuncla örtmək; tunc rəngi vermək, tunc rənginə salmaq; **2.** yanmaq, qaralmaq *(günəşdən)*; *He was richly bronzed by the summer sun Yay günəşi onu qapqara qaraltmışdı*

**brooch** [broutʃ] *n* broşka *(bəzək sancağı)*

**brood**[1] [bru:d] *n* **1.** nəsil; **2.** anasından ayrılmamış balalar *(quş, həşərat və ya heyvanlarda)*; nəsil vermə, törəyib artma; artma, törəmə; **3.** sürü, dəstə, qatar; yığın; **4.** ailə; uşaqlar; **a widow with a ~ of daughters** bir sürü qızla qalmış dul qadın; **5.** sürü, dəstə; **a ~ of scoundrels** bir dəstə / sürü əclaf / yaramaz / alçaq; **6.** arı balası; arı sürfəsi

**brood**[2] [bru:d] *v* **1.** kürt yatmaq; **2.** *şair.* oxşamaq, əzizləmək, nazlamaq; **3.** *məc.* təskin etmək, təskinlik vermək; **4. (on, over)** fikirləşmək, düşünmək; fikrə getmək *(keçmiş bir şey haqqında kədərlə)*; **to ~ on the past** keçmiş haqda fikrə dalmaq; *He likes to brood and hates to act O fikirləşməyi sevir, hərəkət etməyi yox; He often brooded over his sorrow O tez-tez dərdə-qəmə batırdı; Don't just sit here brooding over your troubles; do something Burada oturub müsibətlərin/müsibətləriniz haqqında fikirləşmə/fikirləşməyin, bir iş gör/görün;* **to ~ over schemes of vengeance** intiqam almaq fikri ilə yaşamaq; **5. (on, over)** ağuşuna almaq, çulğamaq; *Silence brooded over the park Sakitlik / Sükut parkı ağuşuna almışdı / çulğamışdı*

**brooder** ['bru:də^r] *n* **1.** *k.t.* bruder *(inkubatordan çıxmış cücələri və başqa ev quşlarının balalarını isti saxlamaq üçün cihaz)*; **2.** tinglik, şitillik, istixana; **3.** kürt / qırt toyuq; **4.** həmişə keçmiş haqqında fikrə dalan adam *(qəmlə, kədərlə)*

**brood-hen** ['bru:d'hen] *n* kürt / qırt toyuq

**broody** ['bru:dı] *adj* **1.** kürt, qırt; kürtyatan, qırtyatan; **2.** *d.d.* fikirli, dalğın, fikrə dalmış; dinməz, danışmaz, azdanışan

**brook** [bruk] *n* kiçik çay

**brooklet** ['bruklıt] *n* balaca / kiçik çay

**broom** [bru:m] *n* **1.** süpürgə; **2.** *bot.* nəfəsotu;

◊ *A new broom sweeps clean at. söz Təzə süpürgə təmiz süpürər*



**broth** [brɔθ] *n* bulyon, ət suyu; **chicken ~** çolpa / toyuq bulyonu;

◊ **a ~ of a boy** qəşəng/gözəl/xoşagələn oğlan

**brothel** ['brɔθl] *n* fahişəxana, qəhbəxana

**brother** ['brʌðə^r] *n* **1.** qardaş; **sworn ~s** siğəqardaşlar; *John and Tom are brothers Con və Tom qardaşdılar; I have two brothers Mənim iki qardaşım var; You have been like a brother to me Sən / Siz mənə qardaş kimisən/kimisiniz;* **2.** *(pl* **brethren)** bir qrupa/təşkilata mənsub adam, sənət/ peşə yoldaşı; **~ in arms** silahdaş; **~ of brush** fırça yoldaşı; **~ of the quil** qələm yoldaşı

**brother-consaguinean** ['brʌðə.konsæŋ' gwıʊnıən] *n (pl* **brothers-consanguinean)** atabir anadan ayrı qardaş

**brother-german** ['brʌðə'dʒə:mən] *n (pl* **brothers-)** doğma qardaş

**brotherhood** ['brʌðəhud] *n* **1.** qardaşlıq; **~ of blood** qan qardaşlığı; **the great ~ of nations** millətlərin böyük qardaşlığı; **2.** qardaşlıq / dostluq münasibəti; **3.** əməkdaşlıq, həmkarlıq, məsləkdaşlıq

**brother-in-law** ['brʌðərınlɔ:] *n (pl* **brothers-in-law)** qayın *(ərin qardaşı)*, yeznə *(bacının əri)*; qayın *(arvadın qardaşı)*; bacanaq

**brotherly**[1] ['brʌðəlı] *adj* qardaş, qardaşlıq; **~ love** qardaş / qardaşlıq məhəbbəti

**brotherly**[2] ['brʌðəlı] *adv* qardaş kimi, qardaşcasına; **to love *smb.* ~** bir kəsi qardaş kimi sevmək

**brothership** ['brʌðəʃıp] *n* qardaşlıq, dostluq, yoldaşlıq

**brother-uterine** ['brʌðə'ju:tərаın] *n (pl* **brothers-uterine)** anadan bir/anabir qardaş

**brotherwort** ['brʌðəwə:t] *n bot.* kəklikotu, kəkotu

**brougham** ['bru:əm] *n* biratlı ikiyerli və ya dördyerli fayton

**brought** [brɔ:t] **to bring** *felinin pt, pp formaları*

**brow** [brau] *n* **1.** qaş; **to knit *one's* ~s** qaşlarını çatmaq; **2.** *şair.* alın; **3.** *şair.* üzün ifadəsi; **an angry ~** acıqlı / hirsli görkəm; **4.** çıxıntı, çıxıq *(qayada və s.); The path runs along the brow of the cliff to the summit Cığır qayanın çıxıntısı ilə zirvəyə qalxır*

**brow-ague** ['brau'eıgju:] *n tib.* miqren, parabaş *(adət. başın bir yarısında əmələ gələn əsəb ağrısı)*

**browbeat** ['braubı:t] *v (pt* **browbeat***; pp* **browbeaten** [['brau.bı:tn]*)* qorxutmaq, hədələmək, qara-qorxu/hədə-qorxu gəlmək; hürkütmək, hürküdüb qaçırmaq; *He was browbeaten and threatened Ona hədə-qorxu gəldilər;* **to ~ into doing *smth.*** hədə-qorxu ilə bir işi görməyə məcbur etmək

**browbeaten** ['brau.bı:tn] **to browbeat** *felinin k.z. feli sifət forması*

**brown**[1] [braun] *n* palıdı rəng/boya, xurmayı rəng, mixəyi rəng

**brown**[2] [braun] *adj* **(-er, -est) 1.** darçını, qəhvəyi, mixəyi, xurmayı; şabalıdı, palıdı; **~ hair** şabalıdı/xurmayı saç; **~ shoes** şabalıdı/palıdı ayaqqabı; *She has brown hair Onun xurmayı saçı var;* **2.** əsmər, qara, qarabuğdayı; günəşdən qaralmış/yanmış; **thin ~ hands** günəşdən qaralmış arıq əllər; **as ~ as a berry** günəşdən bərk yanmış/qaralmış; **3.** qonur *(göz haq.)*; **~ eyes** qonur gözlər; *She likes to wear brown O, qonur rəngdə geyinməyi xoşlayır;*

◊ **~ study** fikirləşmə, düşünmə; fikir; düşüncə; xəyalat; faydasız xəyalat; **to do ~** qızartmaq; *The fish was done brown Balıq yaxşı qızardılmışdı*

**brown**[3] [braun] *v* **1.** mixəyi/darçını/qəhvəyi /xurmayı /palıdı rəngə salmaq; **2.** mixəyi/ darçını /qəhvəyi / palıdı rəng almaq; *The meat takes some time to brown properly when cooking Bişirilərkən ətin darçını / mixəyi rəng alması üçün xeyli vaxt gedir;* **3.** qızarmaq, qovrulmaq; **~ed by the sun** günəşdən qızarmış/yanmış; **4.** yandırmaq, qaraltmaq; *The hot sun had parched and browned him Günəşdən onun dərisi qurudu və qaraldı*

**brown bear** ['braun'beə^r] *n zool.* boz/qonur ayı

**brown bread** ['braun'bred] *n* **1.** ələnməmiş undan bişirilmiş çörək *(İngiltərədə)*; **2.** qarğıdalı unu qatılmış buğda və ya çovdar unundan bişirilmiş çörək

**brown coal** ['braunkoul] *n* liqnit *(boz daşkömür)*

**brown hare** ['braun'heə^r] *n zool.* boz dovşan

**brownie** ['braunı] *n* **1.** *folk.* cin, damdabaca; **2.** qoz qatılmış şokolad pirojnası

**browning**[1] ['braunıŋ] *n* I *hərb.* brauninq, brauninq tapançası

**browning** ['braunıŋ] *n* II **1.** qızartma, qovurma; **2.** şirələmə *(saxsı qabları)*

**browning**[2] ['braunıŋ] *adj* brauninq; **~ automatic rifle** Brauninq avtomat tüfəngi; **~ machine gun** Brauninq pulemyotu

**brown mustard** ['braun'mʌstəd] *n bot.* Misir yaxud Çin xardalı

**brown-nose**[1] ['braunnouz] *n* **1.** *jarq.* yaltaq, qılığagirən *(adam)*; **2.** istəkli, sevimli

**brown-nose**[2] ['braunnouz] *v jarq.* yaltaqlanmaq, yaltaqlıq etmək, qulluq göstərmək

**brown paper** ['braun'peıpə^r] *n* sarğı/sarğılıq kağızı *(şey bükmək üçün sarıtəhər kağız)*

**brown rice** [.braun'raıs] *n* çəltik, döyülməmiş düyü

**brown-rot** ['braun'rɔt] *n* palıdı çürüntü *(alma, heyva, armud və s. çürüntüsü)*

**brownshirt** ['braunʃə:t] *n* mixəyi / qonur köynəkli, faşist, hitlerçi

**brown soil** ['braun'sɔıl] *n* qonur torpaq

**brownstone**[1] ['braunstoun] *n* **1.** *miner.* qonur qumdaşı; **2.** qonur qumdaşından tikilmiş bina

**brownstone**[2] ['braunstoun] *adj* **1.** qonur qumdaşından tikilmiş; **2.** *amer.* dövlətli, zəngin; aristokratik; **~ district** aristokratlar yaşayan ərazi; **~ vote** dövlətli / zəngin seçicilərin səsləri

**brown sugar** ['braun'ʃugəʳ] *n* qonur qənd *(yumşaq qənd növü)*
**brown ware** ['braunweəʳ] *n* saxsı qab
**browny** ['braunı] *adj* qonur rəngə çalan, mixəyi rəngə oxşar
**browse**[1] [brauz] *n* 1. cavan budaq, zoğ; 2. zoğların qoparılması / yeyilməsi
**browse**[2] [brauz] *v* 1. yemək, qırpmaq *(yarpağı, zoğu)*; 2. otlamaq; 3. oradan-buradan oxumaq, nəzərdən keçirmək *(kitabı, jurnalı və s.)*; **to ~ through/ among** ***someone's*** **books** bir kəsin kitablarını oradan-buradan oxumaq
**bruise**[1] [bru:z] *n* 1. əzik, zədə; əzilmiş/zədələnmiş yer, zədə yeri; göy, qançır *(bədəndə)*; 2. əzik-üzük yer, zədə *(meyvədə)*
**bruise**[2] [bru:z] *v* 1. əzmək, zədələmək, toxundurub zədələmək/əzmək; burub göyərtmək; *She fell and bruised her knee O yıxıldı və dizini əzdi/zədələdi; The child has bruised its arm Uşaq qolunu əzib / zədələyib;* 2. zədələnmək, əzilmək; *Pack the peaches carefully so that they don't bruise Şaftalıları ehtiyatla qablayın ki, əzilməsin/zədələnməsin; The skin of a soft fruit bruises easily Yumşaq meyvənin qabığı asanlıqla zədələnir;* 3. döymək, əzmək; *Large pieces must be bruised İri hissələr əzilməlidir/döyülməlidir;* 4. əzmək, zədələmək *(meyvəni, tərəvəzi)*
**bruised** [bru:zd] *adj* əzilmiş, zədələnmiş; **a ~ knee** əzilmiş/zədələnmiş diz; **~ fruit** əzilmiş / zədələnmiş meyvə
**bruiser** ['bru:zəʳ] *n* 1. yekəpər/kobud/güclü adam; 2. *id.* professional boksçu; pəhləvan; 3. qüvvətli/güclü davakar adam; 4. *tex.* optik şüşələri cilalamaq üçün cihaz
**bruising** ['bru:zıŋ] *adj* amansız; **a ~ battle between two fighters** iki dalaşan arasında amansız döyüş
**bruit**[1] [bru:t] *n* 1. şayiə, söhbət; 2. *tib.* səs *(ciyərlərə və ya ürəyə qulaq asarkən eşidilən)*
**bruit**[2] [bru:t] *v* şayiə / söz gəzdirmək; *It is bruited that about/abroad Şayiə gəzir... ki,; It's been bruited abroad that you're going to get married Şayiə gəzir ki, sən/siz evlənmək fikrinə düşmüsən/düşmüsünüz*
**brumal** ['bru:məl] *adj* qış; **~ sleep** qış yuxusu
**brume** [bru:m] *n* duman; tüstü; buxarlanma
**brumous** ['bru:məs] *adj* dumanlı, sisli, dumana bürünmüş, duman basmış
**brunch**[1] [brʌntʃ] *n d.d.* gec yeyilmiş səhər yeməyi
**brunch**[2] [brʌntʃ] *v d.d.* səhər yeməyini gec yemək
**brunette** [bru:'net] *n* qarayağız/qarabuğdayı qız / qadın
**brunt** [brʌnt] *n* zərbənin gücü, əsas zərbə, əsas ağırlıq; **to bear the ~** əsas zərbəyə tab gətirmək, döyüşün əsas ağırlığına dözmək; *The Soviet Union bore the brunt of the war Sovet İttifaqı müharibənin əsas ağırlığına dözdü / tab gətirdi*
**brush**[1] [brʌʃ] *n* I 1. şotka; **a hard ~** cod/qaba şotka; **a sweeping ~** döşəmə şotkası; **a ~ for clothes** paltar şotkası; **to shine with a ~** şotka ilə təmizləmək; **to stroke the hair with a ~** saçı şotka ilə sığallamaq; 2. paltarı təmizləmə *(şotka ilə)*; **to have a ~** şotka ilə üst-başını təmizləmək; **to give** ***one's*** **clothes a good ~** paltarını şotka ilə yaxşı-yaxşı təmizləmək; *It needs a brush Buna şotka çəkmək lazımdır;* 3. kist, tük qələm; **whitewashing ~** rəngsaz kisti; **writing ~** tük qələm; **painter's ~** rəssam kisti; 4. fırça; **the ~ of Raphael** Rəfaelin fırçası; 5. yumşaq tüklü quyruq *(tülküdə, dələdə)*;
◊ **to show** ***one's*** **~** qaçmaq, qaçıb gizlənmək
**brush** [brʌʃ] *n* II toqquşma, döyüşmə, dalaşma, pəncələşmə, əlbəyaxa olma; **a ~ with the enemy** düşmənlə toqquşma / əlbəyaxa olma
**brush**[2] [brʌʃ] *v* I 1. şotka ilə təmizləmək; **to ~ clothes/teeth** paltarı/dişləri şotka ilə təmizləmək; 2. daramaq, sığallamaq; 3. fırça ilə yazmaq, fırça ilə boya çəkmək / yaxmaq; 4. ətrafına/dövrəsinə kol əkmək; 5. kol-kosdan təmizləmək; 6. *toxuc.* xovu darayıb qaldırmaq; **to ~ aside** rədd etmək, əhəmiyyət verməmək, diqqət yetirməmək; **to ~ aside objections** etirazları rədd etmək, etirazlara diqqət / əhəmiyyət verməmək; **to ~ aside difficulties** çətinliklərə fikir verməmək; **to ~ away** 1) təmizləmək; **to ~ away dirt** çirki təmizləmək; 2) qovmaq; **to ~ away flies** milçəkləri qovmaq; **to ~ down** şotka ilə sığallamaq; **to ~ off** 1) çırpmaq, çırpıb təmizləmək; *He brushed a speck of dust off his cap O, papağından tozu çırpıb təmizlədi;* **to ~ the snow off** qarı çırpıb təmizləmək; **to ~ off** ***one's*** **coat** paltosunu şotka ilə təmizləmək; 2) fikir verməmək, laqeyd yanaşmaq, saymazlıq göstərmək, başdan eləmək; **to ~ the whole matter off** məsələyə fikir verməmək, məsələyə laqeyd yanaşmaq; 3) qaçmaq, əkilmək, götürülmək, daban almaq; *Brush off! Qaç!/Qaçın!;* **to ~ over** sürtmək, yaxmaq; ovxalamaq, ovmaq; **to ~** ***smb.*** **over with brandy** bir kəsi araqla ovxalamaq; **to ~ out** diqqətlə təmizləmək; **to ~ out a room** otağı tərtəmiz süpürmək; **to ~ up** 1) şotka ilə süpürüb bir yerə yığmaq; **to ~ up the crumbs** qırıntıları şotka ilə süpürüb bir yerə yığmaq; 2) şotka ilə yuxarı daramaq; **to ~** ***one's*** **hair up** 1) saçını daraqla yuxarı daramaq; 2) saçını geri atmaq *(üzündən)*; 3) qaydaya salmaq, yırıyığış etmək; *The house needs to be brushed up Evi qaydaya salmaq lazımdır;* 4) özünü qaydaya salmaq; 5) təzələmək *(yaddaşı)*, biliyi genişləndirmək; **to ~ up** ***one's*** **English** ingilis dilini təkmilləşdirmək üçün məşğul olmaq



**brush** [brʌʃ] *v* II 1. *(ehmalca)* toxunmaq / dəymək, ilişmək; *The foliage brushed my cheeks as I ran through the wood Meşənin içi ilə qaçarkən yarpaqlar yanaqlarıma toxunurdu;* 2. tumarlamaq, oxşamaq; *The woman brushed the child's cheek with her fingers Qadın uşağın yanaqlarını barmaqları ilə tumarladı; The light wind gently brushed her cheek Meh onun yanağını oxşadı;* 3. saymazyana /etinasız bir halda keçib getmək *(adətən yavaşca toxunaraq)*; *I wanted to speak to her, but she just brushed past me Mən onunla danışmaq istəyirdim, lakin o saymazyana ötüb keçdi*
**brush-breaker (plough)** ['brʌʃ,breıkəʳ ('plau)] *n k.t.* kol-kos çıxaran *(kotan)*; kolqıran *(maşın)*
**brushwood** ['brʌʃwud] *n* 1. pöhrəlik, kolluq, cəngəllik; 2. xırda ağaclıq *(meşədə)*; 3. çör-çöp, çırpı, şax; çıl-çırpı, yerə tökülmüş quru budaqlar
**brushy** ['brʌʃı] *adj* I pöhrəlik/kol-kos basmış
**brushy** ['brʌʃı] *adj* II 1. qalıntüklü; 2. pırtlaşıq saçlı, saçları qarışmış/pərişan; 3. cod / sərt tüklü, şotkayabənzər, şotkayaoxşar; *His hair was thick and brushy Onun saçı sıx və cod idi*
**brusque**[1] [brusk] *adj* kobud, qaba, sərt, ədəbsiz, hörmət gözləməyən; **blunt and ~ ways of speaking** düz və sərt danışıq tərzi; **a ~ person** kobud / qaba adam; **a ~ behaviour** qaba davranış
**brusque**[2] [brusk] *v* qaba / kobud hərəkət etmək, kobud rəftar etmək
**brusquely** ['bruskli] *adv* kobud, qaba, ədəbsiz; **to speak ~** kobud/qaba/ədəbsiz danışmaq
**brusqueness** ['brusknıs] *n* kobudluq, qabalıq; ciddilik, ədəbsizlik
**brutal** ['bru:tl] *adj* amansız, insafsız, rəhmsiz, qəddar, zalım, daşürəkli; **a ~ person** amansız / insafsız/qəddar/zalım/rəhmsiz adam; **a ~ attack** amansız hücum; **a ~ attacker** rəhmsiz/amansız /qəddar/zalım düşmən; 2. kobud, qaba, ədəbsiz; **a ~ lie** kobud/qaba yalan; **~ manners** kobud / ədəbsiz davranış; **~ amusements** ədəbsiz/biabırçı əyləncələr; 3. acı, kəskin, dözülməz, ağır; **~ facts** kəskin faktlar; **~ truth** acı həqiqət; 4. iyrənc, xoşagəlməz, sərt; **~ weather** iyrənc/xoşagəlməz hava
**brutally** ['bru:təlı] *adv* amansızcasına, insafsızcasına, rəhmsizcəsinə, qəddarcasına, zalımcasına; amansız/insafsız/rəhmsiz/qəddar/zalım bir tərzdə
**brutality** [bru:'tælıtı] *n* 1. qabalıq, kobudluq, zalımlıq, qəddarlıq, insafsızlıq; 2. sərtlik, dəhşət, amansızlıq; **the brutalities of war** müharibənin amansızlıqları / dəhşətləri
**brutalization, -isation** [,bru:təlaı'zeıʃn] *n* 1. amansızlaşma, qəddarlaşma, rəhmsizləşmə; 2. kobudlaşma, qabalaşma; 3. vəhşiləşmə, quduzlaşma, quduz / vəhşi halına düşmə
**brutalize, -ise** ['bru:təlaız] *v* 1. amansızlaşdırmaq, rəhmsizləşdirmək, qəddar/zalım/daşürəkli etmək; 2. kobud/vəhşi kimi rəftar etmək; *He brutalized the children O, uşaqlarla vəhşi kimi rəftar etdi;* 3. vəhşiləşmək, quduzlaşmaq
**brute**[1] [bru:t] *n* 1. heyvan; canlı məxluq; 2. həşərat; **gnats and other little ~s** ağcaqanad və digər başqa xırda həşəratlar; 3. heyvan *(xüs. böyük)*; *The horse broke its leg when it fell and the poor brute had to be destroyed At yıxılanda qıçını sındırdı və yazıq heyvanı öldürməli oldular;* 4. kobud/qaba /hissiyyatsız /ədəbsiz adam; *He's an unfeeling brute O, hissiyyatsız/qaba/ədəbsiz adamdır; He's a great brute of a man! O, vəhşinin böyüyüdür!; You, brute! Heyvanın biri! Əclafın biri!*
**brute**[2] [bru:t] *adj* 1. kobud, qaba, heyvani; **~ force** heyvani güc; **~ strength** heyvani qüvvə; 2. amansız, şiddətli, dəhşətli, dözülməz, ağır; **~ forces of nature** təbiətin amansız/dəhşətli gücü; 3. ağılsız, düşüncəsiz; mənasız; **~ creature** düşüncəsiz varlıq; 4. cansız; **~ matter** cansız materiya
**brutish** ['bru:tıʃ] *adj* 1. heyvani; amansız, rəhmsiz, daşürəkli, heyvan kimi, vəhşi heyvana bənzər; **to eat with ~ enjoyment** heyvani ləzzətlə / heyvani həvəslə yemək; 2. axmaq, səfeh, küt, anlamaz
**brutishly** ['bru:tıʃlı] *adv* amansızcasına, heyvancasına, heyvan kimi
**bubble**[1] ['bʌbl] *n* 1. qabarcıq, suluq; **to blow soap ~s** sabun qabarcığı buraxmaq; **~s on a boiling liquid** qaynayan mayenin üstündə olan qabarcıqlar; 2. pıqqıldama *(qaynayan qazanın səsi)*; qur-qur axma *(su və s.)*; **~ of water** suyun qur-qur axması; *We could hear the bubble of the cooking pot Biz xörək bişən qazanın pıqqıltısını eşidə bilirdik / eşidirdik;* 3. dalğalanma, ləpələnmə, təlatüm
**bubble**[2] ['bʌbl] *v* 1. qabarcıqlamaq, qabarcıqlarla örtülmək; qaynamaq; 2. coşmaq, fəvvarə vurmaq *(həm də* **to ~ over, to ~ up***)*; 3. şırıldamaq, şırıltı ilə axmaq *(su və s. haq.)*
**bubblegum** ['bʌbl'gʌm] *n (çeynəyərkən qabarcıqlanan)* saqqız
**bubbly**[1] ['bʌblı] *n jarq.* şampan şərabı
**bubbly**[2] ['bʌblı] *adj* 1. qabarcıqlı; köpüklənən *(şərab haq.)*; 2. qabarıq-qabarıq, qabarcıqlı; qabarıqlı; 3. şən, şad; **~ people at a party** qonaqlıqda özünü şən aparan adamlar
**buccaneer**[1] [,bʌkə'nıəʳ] *n* pirat, dəniz quldurıı
**buccaneer**[2] [,bʌkə'nıəʳ] *v* dəniz quldurluğu etmək
**buck**[1] [bʌk] *n* 1. hər cür heyvanın erkəyi; *(məs. maralın, dovşanın, siçovulun və s.)*; 2. *d.d.* dəndi; modabaz, son dəbdə geyinən, şux/qəşəng geyməyi sevən adam; *Old buck! Dost! Dostum!* *(müraciət forması)*; 3. igid / cəsur / qorxmaz adam; 4. *amer. d.d.* dollar
**buck**[2] [bʌk] *v* 1. şıllaq atmaq, şıllaqlamaq, təpik atmaq *(at haq.)*; *When they tried to ride the horse, it bucked wildly Onlar atı sürmək istəyəndə, o vəhşicəsinə şıllaq atdı;* 2. dartmaq, dartınmaq *(avtomaşın haq.)*; 3. sürmək, cütləşdirmək, basdırmaq *(heyvanlar haq.)*

**buck-basket** ['bʌk.ba:skɪt] *n* çirkli paltar qoymaq üçün səbət
**bucket¹** ['bʌkɪt] *n* **I.** vedrə; badya; **2.** çəlləkk;
◊ **to give the ~** çıxarmaq, qovmaq *(işdən, vəzifədən)*
**bucket²** ['bʌkɪt] *v* **I 1.** *(down)* bərk / güclü yağış yağmaq; *It's been bucketing down all day Bütün günü güclü yağış yağır; The rain is really bucketing down Yağış elə bil vedrədən tökülür;* **2.** atlana-atlana getmək / hərəkət etmək; *The car bucketed down the steep road Maşın enişli-yoxuşlu yolla atlana-atlana aşağıya doğru hərəkət etdi*
**bucket** ['bʌkɪt] *v* **II 1.** götürmək; **2.** *d.d.* atı var gücü ilə qovmaq; sürətlə getmək, çaparaq getmək, qaçmaq; **3.** aldatmaq, dələduzluq/hiyləgərlik / fırıldaqçılıq etmək; **4.** möhtəkirlik etmək, alverlə məşğul olmaq *(birjada)*
**bucket-elevator** ['bʌkɪt'elɪveɪtəʳ] *n* *tex.* noriya *(çalovlu elevator)*
**bucketing** ['bʌkɪtɪŋ] *n* birjada ehtikarlıq/alver / spekulyasiya
**buckle¹** ['bʌkl] *n* toqqa, qayış
**buckle²** ['bʌkl] *v* **1.** toqqa ilə bağlamaq / bərkitmək; *He buckled (up) his belt tightly O, toqqasını/qayışını bərk bağladı; The belt buckled (up) easily Toqqa/Qayış asan bağlandı;* **2.** bağlamaq, qurşamaq; *He buckled on his sword O, qılıncını belinə bağladı / qurşadı;* **3.** əyilmək *(zərbədən, istidən, təzyiqdən və s.); The shock buckled the wheel of my bicycle Zərbə mənim velosipedimin təkərini əydi; The wheel buckled Təkər əyildi;* **4.** *zaraf.* evlənmək; *Soon they were buckled Tezliklə onlar evləndilər;* **5.** saç hörmək, saçı hörüklәmək; **to ~ down** bir iş görməyə ciddi girişmək; **to ~ down to write a book** kitab yazmağa ciddi girişmək; **to ~ to** səy etmək/göstərmək; *If we all buckle to, we'll soon get the work done Əgər biz hamımız səy göstərsək, işi tezliklə görüb qurtararıq*
**buckram** ['bʌkrəm] *n* **1.** qalın kətan, kiş; **2.** müşəmbə
**buckshee¹** [.bʌk'ʃi:] *adj* pulsuz; **~ ticket** pulsuz bilet
**buckshee²** [.bʌk'ʃi:] *adv* pulsuz, pul vermədən; *We can get in buckshee Biz içəri pulsuz girə / daxil ola bilərik*
**buck-saw** ['bʌksɔ:] *n* yayşəkilli mişar
**buck-shot** ['bʌkʃɔt] *n* qırma, saçma
**buckskin** ['bʌkskɪn] *n* **1.** maral/ keçi / sığır dərisindən hazırlanmış gön, maral / keçi / sığır dərisi; **2.** *pl* maral dərisindən tikilmiş şalvar
**buckthorn** ['bʌkθɔ:n] *n* *bot.* murdarça, murdaşar
**buckwheat** ['bʌkwi:t] *n* *bot.* qarabaşaq
**bud¹** [bʌd] *n* **1.** *bot.* tumurcuq, düymə; **in the ~** tumurcuqda/beşikdə, yetişməmiş; **2.** qönçə; **in ~** qönçəli, çiçəklənən, çiçəklənmə üzrə olan; **3.** *d.d.* yeniyetmə qız;
◊ **to nip / to crush in the ~** ≅ beşikdə məhv etmək/boğmaq
**bud²** [bʌd] *adj* qönçələnmə, tumurcuqlanma; **~ stage** *bot.* qönçələnmə/tumurcuqlanma dövrü
**bud³** [bʌd] *v* **(-dd-) 1.** puçurlamaq; qönçələmək; **2.** cücərti / zoğ vermək; **3.** *həm də məc.* çiçəklənmək, çiçəkləmək, çiçək açmaq; **4.** *k.t.* tumurcuqdan calaq etmək; **to ~ off** *k.t.* **1)** tumurcuqlamaq, tumurcuq buraxmaq; qönçələnmək; **2)** cücərmək, cücərti vermək
**Buddha** ['budə] *n* Budda
**Buddhism** ['budɪzm] *n* buddizm *(budda dini)*
**Buddhist** ['budɪst] *n* buddist *(budda dini tərəfdarı)*
**buddhistic** [bu'dɪstɪk] *adj* budda
**budding¹** ['bʌdɪŋ] *n* **1.** *k.t.* peyvənd etmə / edilmə, calama, calanma, calaq edilmə/ olunma; **2.** tumurcuqlama, tumurcuqlanma; **3.** tumurcuqdan peyvənd etmə /edilmə, tumurcuqdan calanma/calama; **4.** qönçələmə, qönçələnmə
**budding²** ['bʌdɪŋ] *adj* **1.** peyvənd; **~ knife** peyvənd bıçağı; **2.** çiçəklənən; oyanan, oyanmış; **~ hopes** oyanmış ümidlər; **3.** ümidverən; **~ diplomat** ümidverən diplomat
**buddy** ['bʌdɪ] *n* *amer.* *d.d.* **1.** dost; *He's my buddy O mənim dostumdur; We are buddies Biz dostuq;* **2.** *amer. (hirsli vaxtı müraciət məqamında işlənir); Get out of my way, buddy Dost, mənim yolumdan qaç!*
◊ **~ seat** motosiklin kolyaskası
**budge¹** [bʌdʒ] *n* aşılanmış qoyun dərisi
**budge²** [bʌdʒ] *v* **1.** tərpənmək, tərpətmək; *He did not budge an inch O, əsla tərpənmədi; I can't budge this rock Mən bu qayanı tərpədə bilmirəm;* **2.** *məc.* dəyişmək; *She won't budge from her opinion O, öz fikrini dəyişməyəcək*
**budget¹** ['bʌdʒɪt] *n* **1.** büdcə; **a family ~** ailə büdcəsi; **a weekly ~** həftəlik büdcə; **a government ~** dövlət büdcəsi; **2.** yığın; **a ~ of news** bir yığın məlumat
**budget²** ['bʌdʒɪt] *v* **1.** büdcədə nəzərdə tutmaq; büdcədən pul buraxmaq/ayırmaq; **2.** nəzərdə tutmaq, planlaşdırmaq; nəzərə almaq; *Budget your time Vaxtını/Vaxtınızı nəzərə al / alın*
**budgetary** ['bʌdʒɪtərɪ] *adj* büdcə; **~ year** büdcə ili
**budlet** ['bʌdlɪt] *n* *bot.* toxumda cücərmə rüşeymi
**buff¹** [bʌf] *n* **1.** camış gönü; **2.** *d.d.* insan dərisi; **to strip to the ~** lüt soyundurmaq; **3.** *amer. d.d.* həvəskar; tərəfkeş; tərəfdar; **jazz ~** caz həvəskarı, cazı sevən/xoşlayan
**buff²** [bʌf] *adj* camış gönündən hazırlanmış
**buff³** [bʌf] *v* zərbəni udmaq, zərbəni amortizasiya etmək
**buffalo** ['bʌfəlou] *n* *(pl* **-oes** [ouz]) *zool.* camış
**buffer¹** ['bʌfəʳ] *n* I *tex.* bufer *(parovozda, vaqonda, topda və s.-də təkanın, zərbənin gücünü azaltmaq üçün yaylı mexanizm)*
**buffer** ['bʌfəʳ] *n* II axmaq/sarsaq/ səy qoca *(kişi)*
**buffer²** ['bʌfəʳ] *v* bufer rolunu oynamaq, bufer vəzifəsi daşımaq
**buffet¹** ['bʌfɪt] *n* I zərbə *(xüs. əllə vurulan, həm də məc.);* **the ~ of fate** taleyin zərbəsi
**buffet** ['bʌfɪt] *n* II bufet *(qab-qacaq üçün)*



**buffet** ['bʌfɪt] *n* III bufet
**buffet²** ['bʌfɪt] *v* **1.** zərbə endirmək/vurmaq; **2.** mübarizə aparmaq *(xüs. dalğa ilə);* **3.** itələyib / yarıb keçmək
**bufflehead** ['bʌflhed] *n* gic, axmaq, qanmaz, kərəzhin
**buffleheaded** ['bʌfl'hedɪd] *adj* beyinsiz, ağılsız, başıboş
**buffoon¹** [bʌ'fu:n] *n* kloun, oyunbaz; təlxək; **to act/to play the ~** təlxəklik/hoqqabazlıq/ədabazlıq etmək; əzilib-büzülmək
**buffoon²** ['bʌ'fu:n] *v* təlxəklik/oyunbazlıq etmək, oyun çıxarmaq
**buffoonery** [bʌ'fu:nərɪ] *n* təlxəklik, oyunbazlıq, masqaraçılıq
**bug¹** [bʌg] *n* **1.** taxtabiti; **2.** böcək; həşərat; **3.** dəli, ruhi xəstə, gic; qeyri-normal; **4.** entuziast *(var qüvvəsilə, böyük həvəslə işləyən adam);* **5.** yoluxucu xəstəlik; **6.** başqalarının danışığını dinləmək üçün cihaz; *There is a bug in this room somewhere Bu otağın harasındasa danışığa qulaq asmaq üçün aparat qoyulub / var;* **7.** *amer.* maşında nasazlıq; **8.** özü aralanan şöbə *(kosmik gəmidə);* **lunar /moon ~ 1)** *insanı kosmik gəmidən aya endirən və geri qaytaran uçan aparat;* **2)** *ayda hərəkət etmək üçün apparat;*
◊ **big ~** vacib adam *(zarafat)*
**bug²** [bʌg] *v* **(-gg-)** xəlvəti/gizli qulaq asmaq üçün mikrofon qoymaq/yerləşdirmək; *The police bugged my office Polis mənim ofisimə xəlvəti/gizli qulaq asmaq üçün aparat qoyub;* **2.** əsəbiləşdirmək, hirsləndirmək; *I got bugged with him for being so stupid Onun belə səfeh olmağı məni əsəbiləşdirdi;* **3.** zəhləsini tökmək; *Stop bugging me! Zəhləmi tökmə/tökməyin!*
**bugaboo** ['bʌgəbu:] *n* uyuq, qorxuluq; cin, qulyabanı; xortdan
**bugger¹** ['bʌgəʳ] *n* **1.** zəhlətökən / axmaq adam; **2.** *tab.* pederastiya ilə məşğul olma, uşaqbazlıq; heyvanlarla cinsi əlaqə
**bugger²** ['bʌgəʳ] *v* **1.** *tab.* pedarastiya ilə məşğul olmaq, uşaqbazlıq etmək; heyvanlarla cinsi əlaqədə olmaq; **2.** *hüq.* uşaqbazlıqda günahlandırmaq
**buggery** ['bʌgərɪ] *n* pedarastiya, uşaqbazlıq; sodomiya *(heyvanlarla cinsi əlaqədə olma)*
**buggy** ['bʌgɪ] *n* **1.** bir at qoşulan yüngül fayton; **2.** uşaq arabası *(uşaq gəzdirmək üçün)*
**bughouse** ['bʌghaus] *n* *(pl* **-houses** ['hauzɪz]) *amer.* dəlixana, dəlilər üçün xəstəxana
**bugle¹** ['bju:gl] *n* ovçu şeypuru; şeypur *(siqnal borusu)*
**bugle²** ['bju:gl] *v* **1.** şeypur çalmaq; **2.** şeypurla siqnal vermək
**bugler** ['bju:gləʳ] *n* şeypurçu, şeypur çalan
**build¹** [bɪld] *n* forma, quruluş; bədən quruluşu; *We are of the same build Bizim bədən quruluşumuz eynidir;* **a man of sturdy ~** möhkəm bədənli adam
**build²** [bɪld] *v* *(pt, pp* **built) 1.** tikmək; çəkmək; **to ~ a bridge/a house** *etc.* körpü/ev və s. tikmək; **to ~ a railway** dəmir yolu çəkmək; *They are building a new club Onlar yeni klub tikirlər; That house is built of brick(s) O ev kərpicdən tikilib;* **2.** formalaşdırmaq, yaratmaq; *Hard work builds (up) character Ağır iş xarakter(i) formalaşdırır;* **3.** **(upon)** əsaslandırmaq; *You must build your theory upon facts Sən / Siz öz nəzəriyyəni / nəzəriyyənizi faktlarla əsaslandırmalısan/əsaslandırmalısınız*
**builder** ['bɪldəʳ] *n* **1.** inşaatçı, inşaat işçisi; **a firm of local ~s** məhəlli inşaatçılar firması; **2.** dülgər; bənna; **3.** podratçı, podratla iş görən
**builder-upper** ['bɪldə'ʌpəʳ] *n* *amer.* stimullaşdırıcı vasitə, stimul verən; canlandıran, fəaliyyətə gətirən; *Vegetable juice is a good builder-upper Tərəvəz şirəsi yaxşı stimullaşdırıcı vasitədir*
**building** ['bɪldɪŋ] *n* **1.** bina, tikili; *Houses are a building Evlər/Binalar tikilir;* **2.** tikmə, tikilmə; bina etmə / edilmə; **3.** inşaat; qurma, tikinti
**built¹** [bɪlt] **to build** *felinin pt, pp forması*
**bulbul** ['bulbul] *n* bülbül
**Bulgarian¹** [bʌl'geərɪən] *n* **1.** bolqar; **the ~s** *top.i* bolqarlar; **2.** bolqar dili
**Bulgarian²** [bʌl'geərɪən] *adj* bolqar, Bolqariya; **the ~ language** bolqar dili
**bulge¹** [bʌldʒ] *n* **1.** qabarıqlıq; qabarıq yer; **2.** *jarq.* çıxıntı; **~ of a curve** əyrinin çıxıntısı; **3.** üstünlük; **to have/to get the ~ on** *smb.* bir kəsin üzərində üstünlüyə malik olmaq; **4.** müvəqqəti artırma/çoxaltma
**buldge²** [bʌldʒ] *v* **1.** qabağa çıxmaq, qabarmaq, irəli çıxmaq; qabartmaq, basıb çıxartmaq; şişirtmək, dombaltmaq; **to ~ *one's* cheeks** yanaqlarını şişirtmək/dombaltmaq; **2.** öz formasını/şəklini dəyişmək; **3.** köpmək, şişmək; həddən artıq / çox dolmaq *(kisə, pul kisəsi, torba və s. haq.);* **4.** müvəqqəti artmaq
**bulging¹** ['bʌldʒɪŋ] *n* **1.** qabarma, qabağa çıxma; **2.** şişmə, köpmə; **3.** əyrilik, əyri / əyilmiş yer
**bulging²** ['bʌldʒɪŋ] *adj* **1.** şişmiş, köpmüş; **2.** qabarıq, qabağa/irəli çıxmış; dombalan; **~ eyes** dombalan gözlər
**bulk¹** [bʌlk] *n* **I 1.** böyüklük, həcm; çoxlu, külli; çoxlu miqdar; **to buy in ~** külli miqdarda almaq, topdan satış yolu ilə çoxlu almaq; **to sell in ~ 1)** topdan satış yolu ilə satmaq; **2)** bütövlükdə satmaq *(qablanmamış halda);* **to load in ~** malı qablanmamış halda yükləmək; **2.** əsas hissə / kütlə; *The bulk of the work has already been done İşin əsas/çox hissəsi artıq görülüb*
**bulk** [bʌlk] *n* II piştaxta; alver budkası, dükança
**bulk²** [bʌlk] *v* **1.** bir yerə yığmaq; tığ vurmaq, üst-üstə yığmaq/qalamaq; **2.** bütün yükü təqdim etmək *(gömrüyə);* **to ~ up** həcmcə artmaq
**bulker** ['bʌlkəʳ] *n* I *rüsumu / vergini müəyyənləşdirmək üçün gəmiyə vurulacaq müxtəlif malların həcmini müəyyən edən mütəxəssis*

**bulker** ['bʌlkəʳ] *n* II 1. fahişə; 2. *jarq.* cibgir, cibgirən, cibkəsən; xırda şeylər oğrusu
**bulkiliness** ['bʌlkılınıs] *n* yöndəmsizlik, lənglik, yekəpərlik, biçimsizlik
**bulkily** ['bʌlkılı] *adv* yöndəmsiz/təhərsiz bir tərzdə, yöndəmsizcəsinə, təhərsizcəsinə
**bulky** ['bʌlkı] *adj* 1. böyük; irihəcmli; 2. yekə, iri; ağır, ləng, yöndəmsiz, təhərsiz, yekəpər, biçimsiz; **a ~ woolen garment** biçimsiz / yöndəmsiz yun geyim
**bull**[1] [bul] *n* I 1. *zool.* buğa, kələ; 2. iribuynuzlu heyvanların erkəyi *(fil, balina və s.)*; *This elephant is a bull Bu fil buğadır;* 3. səsli-küylü yöndəmsiz adam; 4. *amer.* polis, xəfiyyə; 5. *astr.* Buğa bürcü; **to be born under the Bull** Buğa bürcü altında doğulmaq; *He was born under the Bull O, Buğa bürcü altında doğulub;* 6. birjalarda qiymətlərin qalxması sayəsində möhtəkirlik edən şəxs;
◊ **to take the ~ by the horns** işə ciddi girişmək, həlledici həlqədən yanaşmaq
**bull** [bul] *n* II boş/axmaq / səfeh / mənasız söhbət, cəfəngiyyat; **a lot of ~** bir aləm cəfəngiyyat
**bull**[2] [bul] *adj* 1. buğa, kələ; **~ skin** buğa / kələ dərisi; **~ neck** buğaboyun *(yəni yoğunboyun)*; **in a ~ rage** buğa kimi qızğın; 2. güclü, zorba, qüvvətli, sağlam; **in a ~ voice** uca səslə; 3. qiymətlərin qalxmasından bəhrələnən/istifadə edən *(birjalarda)*; 4. *amer.* optimist, şən
**bull**[3] [bul] *v* 1. qiymətləri qaldırmaq *(birjalarda)*; 2. qiymətlərin qalxmasından öz xeyri üçün istifadə etmək, qiymətlərin qalxması zamanı möhtəkirlik etmək *(birjalarda)*; **to ~ the market** bazarda qiymətləri qaldırmaq
**bull-calf** ['bulka:f] *n* 1. cöngə; 2. səfeh, sarsaq, gic, axmaq *(adam)*
**bull-dog** ['buldɔg] *n* 1. buldoq *(it cinsi)*; 2. inadkar adam; 3. iri kalibrli revolver; 4. *amer.* mozalan; 5. *amer. d.d.* qəlyan
**bulldoze** ['buldouz] *v* 1. buldozerlə sıyırmaq/hamarlamaq; **to ~ the ground before building** tikinti aparmazdan əvvəl yeri buldozerlə sıyırmaq/hamarlamaq; 2. zorla keçirmək; *He bulldozed his plan through Parliament O, planını parlamentdən zorla keçirdi;* 3. məcbur etmək *(güclə və ya hədə-qorxu gəlməklə)*; *They bulldozed the boy into agreeing Onlar oğlanı razılaşmağa məcbur etdilər*
**bulldozer** ['bul,douzəʳ] *n* 1. buldozer; 2. buldozerçi
**bullet**[1] ['bulıt] *n* 1. güllə; 2. *tar.* qumbara; top gülləsi *(şarşəkilli)*
**bullet**[2] ['bulıt] *adj* güllə; **~ wound** güllə yarası
**bullethead** ['bulıthed] *n* 1. girdəbaş *(adam)*; 2. höcət, tərs, inadcıl, inadkar, kəc *(adam)*
**bulletheaded** ['bulıt'hedıd] *adj* 1. girdəbaşlı; şamamabaşlı; 2. höcət, tərs, inadkar, inadcıl, kəc
**bulletin**[1] ['bulıtın] *n* 1. bülleten *(qısa rəsmi məlumat)*; *Here is the latest bulletin about the President's health Prezidentin səhhəti haqqında ən son bülleten budur;* 2. bülleten *(müxtəlif idarə və ya müəssisələr tərəfindən dövraşırı nəşr edilən əsərin adı)*; **to read the news ~** xəbərlər bülletenini oxumaq
**bulletin**[2] ['bulıtın] *v* 1. bülleten buraxmaq / nəşr etmək; 2. bülleten vasitəsilə məlumat vermək
**bulletin board** ['bulıtınbɔ:d] *n amer.* elanlar lövhəsi
**bulletproof** ['bulıtpru:f] *adj* güllə keçirməyən; **a ~ car** güllə keçirməyən maşın; **a ~ garment** güllə keçirməyən geyim
**bullfight** ['bulfaıt] *n* öküz / buğa döyüşü *(İspaniyada, Cənubi Amerikada)*
**bullfighter** ['bulfaıtəʳ] *n* toreador *(İspaniyada öküz döyüşündə öküzə qılıncla son zərbəni vurub öldürən pəhləvan)*, matador *(buğa döyüşündə baş döyüşçü)*
**bullfinch** ['bulfıntʃ] *n zool.* qar quşu
**bull-frog** ['bulfrɔg] *n zool.* yekə/iri qurbağa
**bullhead** ['bulhed] *n* 1. *zool.* çayda yaşayan xul balığı; 2. *zool.* iri naqqa balığı; 3. gic, axmaq, səfeh, sarsaq, korazehin, anlamaz
**bullheaded** ['bul'hedıd] *adj* 1. özbaşına, öz bildiyini edən, kefi istədiyi kimi hərəkət edən; höcət, inadkar, inadcıl; 2. azğın; haqq-hesabını bilməyən
**bulling heifer** ['bulıŋ'hefəʳ] *n* düyə
**bullion** ['buljən] *n* I qızıl və ya gümüş külçə
**bullion** ['buljən] *n* II 1. qızıl və ya gümüş kruje-va; 2. qızıl və ya gümüş güləbətin
**bullnecked** ['bulnekt] *adj* buğaboyun, öküzboyun *(qısa yoğun boynu olan)*
**bullock** ['bulək] *n* 1. öküz, axtalanmış öküz; 2. cöngə
**bullring** ['bul,rıŋ] *n* öküz/buğa döyüşdürmək üçün meydan
**bull-pen** ['bulpen] *n* buğa/kələ üçün burdaq
**bull's-eye** ['bulzaı] *n* 1. *dən.* illüminator; 2. siqnal fanarı; 3. qısa fokslu linza; 4. *hərb.* hədəfin mərkəzi; 5. dəqiq atəş; hədəfə düz/dəqiq atəş açma; **to score / to hit the ~** hədəfə düşmək; *Your last remark really hit the bulls' eye Sənin /Sizin son iradın/iradınız düz hədəfə dəydi*
**bully**[1] ['bulı] *n* I 1. xuliqan, dələduz; talançı; 2. davakar, dalaşqan, sataşqan; 3. sutenyor *(aşnası fahişənin xərcilə yaşayan kişi)*; 4. bandit; muzdlu cani; 5. *tex.* buruq çəkici;
◊ *A bully is always a coward at.söz. Dələduz həmişə qorxaq olar*
**bully** ['bulı] *n* II ət konservi
**bully**[2] ['bulı] *adj* 1. yaxşı, çox gözəl; 2. *amer.* birinci dərəcəli; əla, ən yaxşı,çox yaxşı
**bully**[3] ['bulı] *v* 1. qorxutmaq, qorxuya salmaq; tabe/məcbur etmək **to ~ into submission** güc işlətməklə tabe etmək; *They were bullied out of their right Onları öz hüququndan imtina etməyə məcbur etdilər;* 2. sataşmaq; incitmək, cana /təngə gətirmək, zəhlə tökmək; kobud / qaba rəftar etmək



**bully**[4] ['bulı] *int. Afərin! Bravo!; Bully for you! d.d. Afərin sənə / sizə! Bravo!*
**bullyboy** ['bulıbɔı] *n* qaba / kobud oğlan
**bully off** ['bulı'ɔf] *v* hokkey oyununu başlamaq
**bulwark**[1] ['bulwək] *n* 1. qala, bürc, istehkam; 2. dayaq, istinadgah; müdafiə; **a ~ of peace** sülhün dayağı; 3. bənd, dalğaqıran; 4. *dən.* falsbort *(gəmidə göyərtə hasarı)*
**bulwark**[2] ['bulwək] *v* 1. bəndlə bərkitmək, bənd çəkmək; 2. dayaq/istinadgah olmaq; *Friends bulwarked him about Dostlar ona dayaq oldular, Dostlar onun arxasında dağ kimi dayandılar*
**bum**[1] [bʌm] *n* I dal, oturacaq, göt
**bum** [bʌm] *n* II *amer. d.d.* tənbəl, avara, veyl; yaramaz, əlindən iş gəlməyən, vecsiz *(adam)*;
◊ **to go on the ~** səfil-sərgərdan gəzmək, sərsəri həyat keçirmək, avaralanmaq, veyllənmək
**bum** [bʌm] *n* III 1. dilənçi *(qapı-qapı gəzən)*; 2. dilənçi həyatı
**bum**[2] [bʌm] *adj* 1. çox pis, yararsız; **some ~ advice** yararsız məsləhət; 2. işə yaramayan, əl verməyən yararsız; **a ~ knife** yararsız bıçaq
**bum**[3] [bʌm] *v* (-mm-) I *amer.* 1. *d.d.* boş-bikar gəzmək, heç bir iş görməmək, tənbəllik etmək, veyl-veyl / avara gəzmək, veyllənmək; **to ~ around the city** şəhəri boş-bikar/veyl-veyl gəzmək, şəhərdə avaralanmaq/veyllənmək; 2. *jarq.* özgənin/özgələrin hesabına yaşamaq; *He bummed it on his relatives O, qohumlarının hesabına yaşayırdı;* 3. əyyaşlıq etmək
**bum** [bʌm] *v* (-mm-) II 1. ucadan vızıldamaq; 2. *məc.* səs-küy/hay-haray salmaq
**bum** [bʌm] *v* (-mm-) III istəmək; dilənmək, dilənçilik etmək; *Can I bum a cigarette off you? Sən / Siz mənə bir siqaret verə bilərsənmi / bilərsinizmi?;* **to go on the ~** dilənmək, dilənçilik etmək; *John lost his job and went on the bum Con işini itirdi və dilənçilik etdi*
**bumble**[1] ['bʌmbl] *n* I 1. *dial. zool.* eşşəkarısı; 2. tənbəl; veyl, avara; əlindən iş gəlməyən
**bumble** ['bʌmbl] *n* II 1. dolaşıqlıq, qarışıqlıq, nizamsızlıq, qaydasızlıq; 2. işdən başı çıxmayan, özünü və başqalarını dolaşdıran adam
**bumble**[2] ['bʌmbl] *v* I 1. vızıldamaq, uğuldamaq; 2. ittiham etmək, günahlandırmaq, suçlamaq
**bumble** ['bʌmbl] *v* II dolaşdırmaq, qarışdırmaq, dolaşıqlıq / qarışıqlıq salmaq
**bumblebee** ['bʌmblbı] *n zool.* eşşəkarısı
**bumboat** ['bʌmbout] *n dən.* şlyupka, qayıq *(sahildən böyük gəmilərə satış üçün tərəvəz və başqa ərzaq gətirən)*
**bumf** [bʌmf] *n jarq.* 1. kağız, sənədlər; 2. təyyarədən atılan vərəqə; 3. ayaqyolu kağızı
**bummer** ['bʌməʳ] *n amer. jarq.* tənbəl, avara, veyl
**bump**[1] [bʌmp] *n* 1. küt zərbə; 2. toqquşma; 3. şiş, qoz *(zərbədən sonra əmələ gələn)*
**bump**[2] [bʌmp] *v* 1. **(against, into)** vurmaq, dəymək, toxunmaq, toqquşmaq; *Tha car bumped the tree Maşın ağaca dəydi; The two cars bumped each other Bu iki maşın toqquşdu; I have bumped my knee against the wall Mən dizimi divara vurdum; Something bumped against me Nəsə mənə toxundu;* 2. *id.* yelkənli gəmi yarışında qalib gəlmək; 3. birdən/gözlənilmədən rast gəlmək, rastlaşmaq; *I bumped into an old friend of mine yesterday Mən dünən köhnə dostlarımdan birinə rast gəldim*
**bump**[3] [bʌmp] *adv* qəfildən, birdən, gözlənilmədən; *He wasn't looking, and ran bump into a tree O baxmırdı və qəfildən/ birdən ağaca toxundu*
**bumper**[1] ['bʌmpəʳ] *n* 1. ağzına qədər / kimi doldurulmuş stəkan /qədəh *(xüs. sağlıq demək məqamında)*; 2. hər hansı çox böyük bir şey; 3. *tələbə jarq.* qayıq sürmə yarışı *(Oksford və Kembric universitetlərində)*; 4. *tex.* 1) bamper; 2) amortizator; 3) bufer
**bumper**[2] ['bʌmpəʳ] *adj* görünməmiş, misilsiz; çox bol, görünməmiş miqdarda; **~ crop/harvest** çox bol/görünməmiş miqdarda/ misilsiz məhsul
**bumper**[3] ['bʌmpəʳ] *v* 1. qədəhi ağzına kimi/qədər doldurmaq; 2. bir kəsin sağlığına badə qaldırmaq
**bumpiness** ['bʌmpınıs] *n* 1. çala-çuxurluq, kələ-kötürlük; 2. eniş-yoxuşluq; 3. qeyri-rəvanlıq
**bumping** ['bʌmpıŋ] *adj* böyük, iri, yekə, çox böyük / yekə
**bumpkin** ['bʌmpkın] *n* yontalanmamış / kobud oğlan, qanmaz, tərbiyəsiz, avam
**bump off** ['bʌmp'ɔf] *v dial.* öldürmək; qətlə yetirmək
**bumpy** ['bʌmpı] *adv* 1. çala-çuxur, kələ-kötür; **a ~ road** çala-çuxur yol; 2. enişli-yoxuşlu; yamanlı-yaxşılı; **a ~ time** enişli-yoxuşlu vaxt; *We've had rather a bumpy time since the war Müharibədən bəri biz çox enişli-yoxuşlu /yaxşılı-yamanlı gün keçirmişik;* 3. qeyri-rəvan, dəyişkən; **~ dance music** qeyri-rəvan rəqs musiqisi
**bun** [bʌn] *n* 1. yağlı/şirin kökə; 2. saç dəstəsi *(xüs. qadınların toplayaraq girdə halda başlarının arxasına bərkitdikləri)*; *She wears her hair in a bun O, saçını başının arxasında girdə şəkildə dəstələyir*
**bunch**[1] [bʌntʃ] *n* **(of)** 1. dəstə, qom; **a ~ of flowers** bir dəstə / qom gül; **a nice ~ of girls** bir dəstə qəşəng qız; **a ~ of keys** bir dəstə açar; **a ~ of thieves** bir dəstə quldur; 2. salxım; **a ~ of grapes** bir salxım üzüm; 3. *amer. d.d.* sürü, naxır; 4. *fiz.* elektron dəstəsi
**bunch**[2] [bʌntʃ] *v* 1. dəstə/qom bağlamaq; 2. qırçınlamaq *(paltarı)*
**bunched** [bʌntʃt] *adj* 1. dəstələnmiş, qomlanmış, dəstəyə vurulmuş; 2. qırçınlanmış *(paltar haq.)*

**bunch-onion** ['bʌntʃ'ʌnjən] *n* dəstəyə vurulmuş soğan, göy soğan
**bunchy** ['bʌntʃı] *adj* 1. qabarıq; dombalan; irəli çıxmış; 2. qozbel, beli bükülmüş, donqar; 3. salxım halında bitən
**bundle**[1] ['bʌndl] *n* 1. bağlama, boğça, düyünçə; **a ~ of clothes** bir bağlama/ boğça paltar; 2. paçka, dəstə, bağlı; **a ~ of banknotes** bir paçka banknot; 3. paket, bağlama
**bundle**[2] ['bʌndl] *v* dəstə/qom bağlamaq; 2. şeyləri qablamaq; 3. göndərmək, yollamaq; qovmaq; *We bundled the children off to school Biz uşaqları tez məktəbə göndərdik*
**bung**[1] [bʌŋ] *n* I 1. tıxac, qapaq; 2. aşxanaçının /meyxanaçının / aşxana sahibinin köməkçisi
**bung**[2] [bʌŋ] *v* 1. tıxmaq, tutmaq, qapamaq, kip bağlamaq; 2. *jarq.* atmaq, qımcırlamaq *(daş və s.)*
**bung**[3] [bʌŋ] *adv* o saat, dərhal; *She went bung into sleep O dərhal yuxuya getdi*
**bungalow** ['bʌŋgəlou] *n* bunqalo *(eyvanı olan birmərtəbəli bağ evi)*
**bunghole** ['bʌŋhoul] *n* çəlləkdə deşik *(çəlləyi boşaltmaq və doldurmaq üçün)*
**bungle**[1] ['bʌŋgl] *n* 1. pis / yaramaz / zay iş
**bungle**[2] ['bʌŋgl] *v* 1. korlamaq, zay etmək *(işi)*; pis işləmək; *He made a bungle of it O, işləri korladı /xarab etdi;* **to ~ a job** işi korlamaq; 2. özünü dolaşdırmaq/çətin vəziyyətə salmaq *(mübahisə zamanı)*; 3. azmaq, çaşmaq, yolunu azmaq
**bungle up** ['bʌŋgl'ʌp] tutmaq, tıxamaq; **to ~ a hole** deşiyi tutmaq / tıxamaq; *My nose is bungled up with a cold Burnum zökəmdən tutulub*
**bunk**[1] [bʌŋk] *n* divara bərkidilmiş çarpayı *(gəmidə, vaqonda)*
**bunk**[2] [bʌŋk] *v* I divara bərkidilmiş çarpayıda yatmaq
**bunk** [bʌŋk] *v* II *jarq.* qaçmaq, qaçıb getmək, tərk etmək *(məcburiyyət qarşısında)*
**bunk bed** ['bʌŋk'bed] *n* ikiqat çarpayı *(üst-üstə bərkidilən və adətən uşaqlar üçün nəzərdə tutulan)*
**bunker** ['bʌŋkəʳ] *n* 1. *dən.* kömür anbarı *(gəmidə)*; **ash ~** küllük; 2. bunker, silos quyusu; 3. iri yeşik / sandıq; daqqa; 4. *hərb.* bunker, uzunmüddətli atəş açmaq üçün tikili / qurğu
**bunk feeder** ['bʌŋk.fi:dəʳ] *n k.t.* avtomatik yemləmə *(axurda, yem təknəsində)*
**bunkhouse** ['bʌŋkhaus] *n* fəhlələrin yatdığı bina / ev
**bunk off** ['bʌŋk'ɔf] *v* qaçmaq *(xüs. məktəbdən)*
**bunk-up** ['bʌŋkʌp] *v* I dırmaşmağa kömək etmək
**bunk up** ['bʌŋkʌp] *v* II *jarq.* **(with)** cinsi əlaqədə olmaq
**bunny** ['bʌnı] *n nəz. forma.* dovşan
**bunting** ['bʌntıŋ] *n zool.* tənək quşu
**buoyancy** ['bɔıənsı] *n* 1. üzmə qabiliyyəti; qaldırıcılıq gücü; 2. sualtı qayığın su üzərində vəziyyəti; 3. şadlıq, şənlik, sevinc, gümrahlıq, ruh yüksəkliyi; **man full of ~** şad / şən / gümrah adam
**buoyant** ['bɔıənt] *adj* 1. üzən, üzə bilən, suyun üzündə dura bilən; **~ mine** *hərb.* üzən mina; 2. suyun üzərində saxlama qabiliyyəti; *Salt water is more buoyant than fresh Duzlu su bir şeyi üzərində şirin sudan daha yaxşı saxlayır;* 3. şən, şad, gümrah; **of ~ disposition** şən/gümrah ovqat
**buoyantly** ['bɔıəntlı] *adv* şad, şən, şad/şən bir tərzdə, gümrahlıqla
**buoy up** ['bɔı'ʌp] *v* kefini durultmaq/qaldırmaq /yüksəltmək; *His spirits were buoyed up by hopes of success Qələbə ümidi onun kefini qaldırdı*
**burble**[1] ['bə:bl] *n* 1. mırtıldama, öz-özünə danışma /mızıldama/donquldanma, burun altında danışma; 2. cəfəngiyyat, boşboğazlıq, boş danışma
**burble**[2] ['bə:bl] *v* 1. mırtıldamaq, öz-özünə danışmaq, donquldanmaq, burnunun altında mızıldamaq/danışmaq; 2. naqqallıq/ boşboğazlıq etmək, laqqırtı vurmaq, boş-boş danışmaq
**burbot** ['bə:bət] *n zool.* nalim *(balıq növü)*
**burden**[1] ['bə:dn] *n* I yük, ağır yük; ağırlıq; **~ of taxation** vergi yükü; **~ of armaments** silahlanmanın ağır yükü; **to be a ~ to** *smb.* bir kəsə *(ağır)* yük olmaq
**burden** ['bə:dn] *n* II 1. nəqərat; 2. mövzu; mahiyyət, əsas fikir / məna; *This was the burden of his remarks Onun qeydlərinin əsas mahiyyəti bu idi*
**burden**[2] ['bə:dn] *v* 1. yükləmək, yük vurmaq; 2. zəhmət vermək, zəhmətə salmaq, çətinə salmaq; yükləmək; **to ~ *one's* memory with useless facts** öz yaddaşını faydasız faktlarla yükləmək; *I will not burden you with a lengthy account Mən sənə/sizə uzun-uzadı hesabatla zəhmət verməyəcəm;* 3. **(with)** *arx.* təqsirləndirmək, müqəssir etmək; günahkar / suçlu bilmək
**burdensome** ['bə:dnsəm] *adj* 1. ağır zəhmətli, məşəqqətli, yorucu; **~ duties** ağır / məşəqqətli vəzifə; 2. qıcıqlandırıcı, əsəbiləşdirici; təngə gətirən, zəhlətökən, usandırıcı; cansıxan, cansıxıcı
**bureau** [bjuə'rou] *n* 1. büro; **information ~** məlumat bürosu; 2. şöbə; idarə; komitə; 3. yazı stolu / mizi; kontorka *(ayaq üstə və ya oturub işləmək üçün hündür stol)*
**bureaucracy** [bjuə'rɔkrəsı] *n* 1. bürokratiya *(bürokratik idarə üsulu)*, bürokratizm; 2. *top.i* bürokratlar, yüksək vəzifə tutan məmurlar
**bureaucrat** ['bjuəroukræt] *n* bürokrat *(süründürməçi, rəsmiyyətçi; böyük vəzifə sahibi)*
**bureaucratic** [.bjuərou'krætık] *adj* bürokratik; **~ government** bürokratik dövlət



**bureaucratically** [.bjuərou'krætıkəlı] *adv* bürokratcasına, bürokratik bir tərzdə / surətdə
**bureaucratism** [bjuə'rɔkrətızm] *n* bürokratizm, süründürməçilik
**burg** [bə:g] *n* orta əsrlər şəhəri və ya qalası
**burgeon**[1] ['bə:dʒən] *n şair.* puçur, qönçə, zoğ, cücərti
**burgeon**[2] ['bə:dʒən] *v* böyümək, inkişaf etməyə başlamaq
**burgess** ['bə:dʒıs] *n* özünüidarəyə/muxtariyyətə malik olan şəhərin sakini/vətəndaşı
**burglar** ['bə:gləʳ] *n* 1. *hüq.* gecə oğrusu, ev / mağaza və s. yaran oğru
**burglary** ['bə:glərı] *n* gecə ev, mağaza və s. yarma
**burgle** ['bə:gl] *v* gecə ev yarmaqla məşğul olmaq, gecə ev yarmaq
**burgomaster** ['bə:gə.ma:stəʳ] *n* burqomistr *(Avropanın bəzi ölkələrində və I Pyotr vaxtında Rusiyada bələdiyyə rəisi)*
**burial** ['berıəl] *n* 1. dəfn, dəfn mərasimi; 2. basdırma, dəfn etmə
**burial-ground** ['berıəlgraund] *n* 1. qəbiristanlıq; 2. radioaktiv qalıqları basdırmaq üçün yer
**burial-place** ['berıəlpleıs] *n* basdırma/dəfn etmə yeri
**burial-service** ['berıəl.sə:vıs] *n din.* cənazə duası, matəm iclası, matəm xidməti
**burn**[1] [bə:n] *n* 1. yanma; yanıq, yanıq yeri; **to die of ~s** yanıqdan ölmək; 2. damğa
**burn**[2] [bə:n] *v (pt; pp* **burnt** [bə:nt] *və ya* **burned** [bə:nd]*)* 1. yandırmaq; *He burnt all his old papers O, bütün köhnə kağızlarını yandırdı;* **to ~ *one's* hands** əllərini yandırmaq; 2. yanmaq; alışıb-yanmaq; *The house is burning Ev alışıbyanır; Paper burns easily Kağız asanlıqla yanır; The potatoes have burnt black and we cannot eat them Kartoflar kömür kimi yanıb, biz onu yeyə bilmərik;* **to ~ with fever** qızdırmadan yanmaq; **to ~ with love/hatred** məhəbbətdən/nifrətdən alışıb-yanmaq; 3. gündə qaralmaq/yanmaq; *Delicate skins burn easily in the sun Zərif dərilər günəşdə asanlıqla qaralır/yanır;* 4. parlamaq, işıq saçmaq, yanmaq *(günəş və s. haq.)*; *Stars were burning dimly Ulduzlar zəif işıq saçırdı;* 5. qızdırmaq *(xörəyi)*; 6. dağ basmaq *(heyvana)*, damğalamaq *(heyvanı)*; **to ~ away** tədricən yanmaq; *Half the candle had burnt away Şamın yarısı yanmışdı/yanıb getmişdi;* **to ~ down** yandırıb kül etmək; *The house was burnt down Ev yanıb kül oldu;* **to ~ in** rəsmlərin bərkidilməsi üçün dulusçuluq məmulatlarını yandırmaq; **to ~ out 1)** yandırmaq, yandırıb məhv etmək; *Soldiers burnt the fort out Əsgərlər istehkamı yandırdılar;* **to ~ out the house and home** ev-eşiyi yandırıb çöldə qoymaq; 2) yandırıb külə döndərmək; 3) əhalini qovmaq məqsədi ilə ev-eşiyi yandırmaq; **to ~ together** qaynaq etmək, qaynaqlamaq;
◊ **to ~ the water** işıq vasitəsilə balıq tutmaq; **to ~ daylight** 1) gündüz işıq yandırmaq; 2) əbəs yerə zəhmət çəkmək; **to ~ *one's* bridges /boats** öz körpüsünü / qayığını yandırmaq *(yəni geriyə yol qoymamaq, döyüşdə ya ölmək, ya da qalib gəlmək)*
**burned** [bə:nd] **to burn** *felinin pt, pp forması:*
**burning**[1] ['bə:nıŋ] *n* 1. yanma, alışma, od tutma; 2. yandırma, bişirmə *(kərpic və s.)*; 3. közərtmə, qızartma, közərdilmə, qızardılma; 4. oksidləşmə, turşuma *(metal haq.)*
**burning**[2] ['bə:nıŋ] *adj* 1. isti, qaynar; **~ sand** isti/qaynar qum; 2. yanan; **a ~ house** yanan ev; *məc.* **~ cheeks** yanan yanaqlar; 3. güclü, çox vacib; **a ~ question** çox vacib məsələ; 4. dəhşətli, müdhiş, heybətli; **~ disgrace** dəhşətli biabırçılıq; **~ shame** müdhiş/heybətli eyib; **~ point** *fiz.* alovlanma nöqtəsi
**burnish**[1] ['bə:nıʃ] *n* 1. pardaqlama, parıldatma; cilalama; 2. parıltı, şölə, nur
**burnish**[2] ['bə:nıʃ] *v* 1. təmizləmək; 2. pardaqlamaq, parıldatmaq, cilalamaq; 2. parlamaq, işıldamaq, şəfəq vermək / saçmaq
**burnisher** ['bə:nıʃəʳ] *n* 1. pardaqçı, cilalayıcı; 2. *tex.* sığallayıcı / pardaqlayıcı alət
**burnt**[1] [bə:nt] *adj* yanıq, yanmış; yandırılmış; **~ lime** söndürülməmiş əhəng; **~ gas** işlənmiş qaz;
◊ *Burnt child dreads the fire at. söz.* ≅ *İlan vuran ala çatıdan qorxar*
**burnt**[2] [bə:nt] **to burn** *felinin pt, pp formaları*
**burrow**[1] ['bʌrou] *n* 1. yuva, yuvacıq; çala, çuxur; 2. *məc.* sığınaq, sığınacaq, daldalanacaq
**burrow**[2] ['bʌrou] *v* 1. yuva/çala qazmaq; **to ~ a hole in the sand** qumda yuva/çala qazmaq; 2. yuvada yaşamaq/gizlənmək; 3. *məc.* gizlənmək; *The refugees burrowed in a cave Qaçqınlar mağarada gizləndilər;* 4. eşələnmək; axtarmaq, əlləşmək *(arxivdə, siyirtmədə və s.)*; *What are you burrowing around in my drawer for? Mənim siyirməmdə nə eşələnirsən/eşələnirsiniz?* 5. başa düşmək, dərk etmək, anlamaq *(sirri və s.)*
**burst**[1] [bə:st] *n* 1. partlayış, partlama; **a ~ of a shell** mərminin partlaması; **a ~ of a bomb** bomba partlayışı; 2. alışma, şölələnmə; od alma /tutma; **a ~ of flame** alovun şölələnməsi; 3. aşıb-daşma, coşma; **~ of energy** enerjinin coşması/aşıb-daşması; **~ of speed** sürətin şiddətlə artması; 4. impuls, təkan; qəfildən radio impulsunun artması; 5. *d.d.* içki məclisi; sərxoşluq, əyyaşlıq; **to go on the ~** kef / sərxoşluq etmək

məzənnəsinin hesablanması; 2. kalkulyasiya; smeta; ~ **of costs** xərclərin smetası; 3. götür-qoy etmə, düşünmə, fikirləşmə; **after much** ~ ətraflı götür-qoy etdikdən / düşündükdən / fikirləşdikdən sonra; *This is no part of my calculation Mən bunu nəzərə almamışam / nəzərdə tutmamışam*

**calculative** ['kælkjulətıv] *adj* hesablama, hesablayıcı

**calculator** ['kælkjuleıtə(r)] *n* 1. kalkulyator, kalkulyasiyaçı; 2. hesablama maşını; 3. arifmometr *(hesablama maşını)*

**calculus** ['kælkjuləs] *n* I *(pl həm də* **-li***)* 1. *riyaz.* hesablama; **the differential** ~ differensial hesablama; ~ **of variation** *riyaz.* variasiya hesabı; 2. kalkulyasiya

**calculus** ['kælkjuləs] *n* II *(pl* **-li***)* *tib.* daş *(böyrəkdə, mədədə)*

**calembour** ['ka:lə:mbuə(r)] *n fr.* kalambur, cinas

**calendar**[1] ['kælındə(r)] *n* 1. kalendar, təqvim; tarix; **Julian Calendar** Yuliyan Kalendarı/təqvimi, Roma təqvimi *(köhnə təqvim)*; **Gregorian Calendar** Qreqoryan təqvimi /kalendarı; yeni kalendar/təqvim; **Christian** ~ Xristian kalendarı/təqvimi *(bizim era: İsanın anadan olduğu gündən hesablanan tarix)*; **Jewish** ~ yəhudi təqvimi/kalendarı; **pull-off/tear-off** ~ stolüstü kalendar/təqvim, tabel-kalendar, tabel-təqvim; 2. siyahıyaalma, siyahı; cədvəl, reyestr; **the** ~ **of past endeavours** 1) keçmiş xidmətlərin siyahısı; 2) göstərici; indeks; 3. almanax *(müxtəlif yazıçıların əsərlərindən ibarət məcmuə)*; 4. *amer.* gündəlik məsələ; cədvəl; 5. *hüq.* baxılacaq/dinlənəcək işlərin siyahısı; 6. *universitetin/kollecin və sairənin salnaməsi*; illik, ildə bir dəfə çıxan *(məcmuə, jurnal və s.)*

**calendar**[2] ['kælındə(r)] *v* 1. siyahıya almaq/salmaq, qeydə almaq, inventarizasiya etmək; 2. göstərici tərtib etmək; 3. gündəlik yazmaq / tərtib etmək

**calender**[1] ['kælındə(r)] *n* I *tex.* kalandar *(parçanı və ya kağızı hamarlayıb ona parıltı verən maşın)*

**calender** ['kælındə(r)] *n* II dərviş

**calender**[2] ['kælındə(r)] *v* parıldatmaq, parlatmaq, pardaxlamaq; cilalamaq; sığal vermək

**calf** [ka:f] *n (pl* **calves***)* 1. buzov; **in/with** ~ boğaz *(inək)*; 2. bala *(maral, fil, balina və s. heyvan balası)*; 3. buzov dərisi; **bound in** ~ buzov dərisi ilə cildlənmiş;

◊ ~**'s teeth** süd dişi; **to eat the** ~ **in the cow's belly** ≅ *Dəryada balıq sevdası*

**calfish** [ka:fıʃ] *adj* 1. dana; 2. gənc, cavan, törpü dəyməmiş, yontalanmamış

**calf-love** ['ka:flʌv] *n* uşaq məhəbbəti/sevgisi

**calf-skin** ['ka:fskın] *n* buzov / dana dərisi

**calibrate** ['kælıbreıt] *v* 1. kalibrləmək, kalibrini ölçmək *(tüfəng, boru və s. diametrini ölçmək)*; 2. yoxlamaq, yoxlayıb düzəltmək

**calibration** [ˌkælı'breıʃn] *n tex.* 1. kalibrləmə, kalibrini ölçmə/yoxlama; 2. dərəcələrini yoxlama; dərəcələrə bölmə/ayırma, dərəcələrə bölünmə/ayrılma; 3. tarasını təyin etmə; arvasını tutma, yerini çəkmə; 4. standartlaşdırma, standartlaşdırılma

**calibre** ['kælıbə(r)] *n* 1. kalibr *(silah lüləsinin və ya borunun daxili ölçüsü/diametri)*; 2. patronun /güllənin ölçüsü; **a 32** ~ **bullet** 32 kalibrli patron/güllə; 3. miqyas, vüsət; 4. məziyyət; keyfiyyət; *The work's of a very high calibre İş yüksək keyfiyyətə malikdir; This doctor's of a very different calibre to the other Bu həkim digərinə nisbətən başqa məziyyətə malikdir*

**calico** ['kælıkou] *n (pl* **-os, -oes** [ouz]*)* *toxuc.* 1. kolenkor *(pambıq parça növü)*

**caliph** ['kælıf] *n tar.* xəlifə

**caliphate** ['kælıfeıt] *n tar.* xilafət, xəlifəlik

**calk**[1] [kɔ:k] *n* 1. tikan *(bitkidə)*; 2. mil uc, diş, çıxıntı; 3. *amer.* nal

**calk**[2] [kɔ:k] *v* 1. nallamaq *(atı və s.)*; 2. *amer.* nal vurmaq *(çəkmənin dabanına)*

**call**[1] [kɔ:l] *n* 1. çığırtı, qışqırtı, qışqırıq, bağırtı; ~ **for help** kömək üçün qışqırtı / qışqırıq; *They heard a call for help Onlar köməyə çağıran bir bağırtı/qışqırtı eşitdilər*; **loud** ~ uca qışqırtı/bağırtı; 2. çağırış; müraciət; **a** ~ **for peaceful coexistence** dinc yanaşı yaşamağa çağırış; *He answered the call of his country O, vətəninin çağırışına cavab verdi*; ~ **to arms** silahlanmaq üçün çağırış/müraciət; 3. çağırış *(məhkəməyə və s.)*, rəsmi dəvət; ~ **of the House** parlamentin bütün üzvlərinin parlamentə çağırılması *(vacib məsələ üzrə səsvermə keçirmək üçün)*; 4. zəng, zəng səsi, telefonla danışıq; **telephone** ~ telefon zəngi; **trunk/***amer.* **long-distant** ~ beynəlxalq çağırış *(telefonla)*; **to take the** ~ 1) telefona/telefon zənginə cavab vermək; 2) telefon vasitəsilə sifariş qəbul etmək; **to make a** ~ *amer.* telefonla zəng etmək/vurmaq; *Give me a call amer. Mənə zəng et/edin*; 5. *teatr.* çağırma, dəvət etmə *(alqışlarla səhnəyə)*; *She had five calls Onu beş dəfə alqışlarla səhnəyə çağırdılar;* **to take a** ~ alqışlara cavab olaraq səhnəyə çıxmaq/təzim etmək; 6. çağırış, səda, hay, haraylama; **the** ~ **of the wild/the sea** təbiətin /dənizin çağırışı / harayı; 7. meyl, həvəs, həvəs göstərmə, qabiliyyət, istedad; 8. vizit, gəlmə, baş çəkmə; **return** ~ cavab viziti; **social** ~ 1) tanışa baş çəkmə; 2) *dip.* rəsmi vizit; **to make** ~**s** görüşə gəlmək, ziyarət etmək; **to pay a** ~ baş çəkmək; **to receive a** ~ qonaq qəbul etmək, görüşə gələni qəbul etmək; 9. ixtiyar, səlahiyyət, vəkalət, hüquq; *He had no call to do that Onun bunu etməyə ixtiyarı yox idi*; **to have / to get a** ~ **upon** *smth.* bir şeyə ixtiyarı/hüququ olmaq; **to have no** ~ **on** *smb.* bir kəsdən kömək gözləməyə heç bir vəkaləti olmamaq; 10. ehtiyac, lüzum, zərurət; *I don't know what call*



*she had to blush so Mən bilmirəm onu belə qızartmağa nə lüzum vardı*; 11. quşların səsi/səs-küyü, quşların qağıltısı; oxuması; *The call of this bird is very loud Bu quşun qağıltısı çox yüksəkdir*; **the** ~ **of nightingale** bülbülün oxuması;

**call**[2] [kɔ:l] *v* 1. qışqırmaq, bağırmaq, çığırmaq; *I heard someone calling me Mən kiminsə məni çağırdığını eşitdim; He called after the girl O, qızın arxasınca qışqırdı / bağırdı*; 2. çağırmaq, səsləmək; *Did you call me? Məni çağırdınmı?/çağırdınızmı? He is in the next room, call him O, qonşu otaqdadır, çağır/çağırın gəlsin*; 3. adlanmaq, adlandırmaq, ad vermək, ad qoymaq; *What is this thing called? Bu şey nə adlanır? What do you call this flower? Bu çiçək necə adlanır? What do you call this in English? Bu ingiliscə nəcə adlanır / adlandırılır? She is called Mary Onun adı Meridir; His name is Richard but everybody calls him Dick Onun adı Riçarddır, lakin hamı ona Dik deyir /onu Dik deyə çağırır;* 4. çağırmaq; təşkil etmək; **to** ~ **a meeting** iclas çağırmaq; **to** ~ **Parliament** parlamenti çağırmaq/toplamaq; 5. çağırmaq; **to** ~ **a taxi** taksi çağırmaq; **to** ~ **a doctor** həkim çağırmaq; 6. oyatmaq; **to** ~ *smb.* bir kəsi oyatmaq; *It's too early to call him Onu oyatmaq hələ çox tezdir*; 7. elan etmək; **to** ~ **a strike** tətil elan etmək; **to** ~ **the banns** kəbini kəsilənlərin adlarını elan etmək; 8. baş çəkmək, görüşə gəlmək; *I was out when he called O mənə baş çəkəndə mən evdə deyildim; I called on Mr. Smith at his office Mən cənab Smitə onun ofisində baş çəkdim; Our new neighbours called at our house last week Bizim təzə qonşularımız keçən həftə bizə gəldilər; The Ambassador called on the Foreign Minister Səfir Xarici İşlər Nazirliyinə görüşə gəlmişdi*; 9. *amer.* zəng etmək/ vurmaq; telefonla danışmaq; *He called me from London O mənə Londondan zəng vurdu / etdi*; 10. hesab etmək; *Do you call English an easy language? Sən/Siz ingilis dilini asan dil hesab edirsən /edirsiniz? He calls the child his son O, uşağı öz oğlu hesab edir; The results of the conference are called satisfactory Konfransın nəticələri qənaətbəxş hesab edilir;* **to** ~ **aside** çəkmək *(bir kənara)*; **to** ~ **away** 1) çağırmaq, ayırmaq; *He called the dog away O, iti geri çağırdı; Death called him away from his friends Ölüm onu dostlarından ayırdı*; 2) *d.d.* boş /əbəs yerə qışqırmaq; *Go on, call away! I shall not come Nə qədər istəyirsən qışqır, mən gəlməyəcəyəm*; **to** ~ **back** 1) geri çağırmaq; *The mother called the child back Ana uşağı evə çağırdı*; 2) geri götürmək *(sözü, vədi)*; 3) ləğv etmək *(əmri və s.)*; 4) xatırlamaq, yada salmaq; 5) *amer.* telefonla zəng etmək *(zəngə cavab olaraq)*; *I'll call you back Mən sənə / sizə bir də zəng edəcəm; I asked him to call me back Mən ondan xahiş etdim ki, mənə bir də zəng etsin*; **to** ~ **down** 1) aşağı çağırmaq; *The gong was calling us down Qonq bizi aşağı çağırırdı*; 2) çağırmaq *(aşağıda duranı)*; **to** ~ **for** 1) tələb etmək *(uca səslə)*; *A man called for a glass of beer Kişi uca səslə bir parç pivə tələb etdi; He called for help O, köməyə çağırdı; Your plan will call for a lot of money Sənin / Sizin planın / planınız çox pul tələb edəcək; The occasion calls for quick action Bu halda cəld hərəkət etmək tələb olunur*; 2) gəlmək; *I'll call for you at five Mən sənin / sizin dalınca / dalınızca saat beşdə gələcəm*; **to** ~ **in** 1) dəvət etmək *(evə)*; 2) çağırmaq; **to** ~ **in a doctor** həkim çağırmaq; **to** ~ **off** 1) geri çağırmaq; 2) təxirə salmaq *(tədbiri və s)*; *The match was called off Yarış təxirə salındı*; 3) yayındırmaq *(diqqəti)*; **to** ~ **out** 1) qışqırmaq, bağırmaq *(ağrıdan və s.)*; 2) çağırmaq *(aktyoru və s. alqışlarla)*; 3) duelə çağırmaq; **to** ~ **over** siyahı üzrə çağırmaq; *The master called over the boys of the class Müəllim sinifdəki oğlanları siyahı üzrə yoxladı*; **to** ~ **up** 1) yuxarı çağırmaq/dəvət etmək; *The boss called me up Sahibkar məni yuxarı çağırdı*; 2) qışqırmaq *(yuxarıdakı adama)*; 3) telefonla zəng etmək/çağırmaq; *I'll call you up this evening Axşam mən sənə / sizə zəng edəcəm*; 4) oyatmaq, ayıltmaq; *I'll call you up at 7 Mən səni / sizi saat 7-də oyadacam*; 5) yada salmaq, xatırlatmaq; *This picture calls up scenes of my childhood Bu şəkil mənə uşaqlıq əhvalatlarımı xatırladır*; **to** ~ **upon** 1) söz vermək, xitabət kürsüsünə çağırmaq; *The chairman called upon Mr. Tom to speak Sədr cənab Toma söz verdi/cənab Tomu danışmaq üçün xitabət kürsüsünə dəvət etdi*; 2) ehtiyac hiss etmək; *He felt called upon to speak O danışmağa ehtiyac hiss etdi;*

◊ **to** ~ **the roll** adbaad oxumaq *(siyahıdan)*; **to** ~ **the shot** *hərb.* nişan nöqtəsini göstərmək; **to** ~ **the score** *id.* hesabda qabaqda olmaq; **to** ~ **attention to** diqqət yetirmək *(bir şeyə)*; **to** ~ **to mind** yada salmaq, xatırlamaq; **to** ~ **to order** 1) qayda-qanuna dəvət etmək; 2) *amer.* iclası açmaq; *I call the meeting to order Mən iclası açıq elan edirəm*; **to** ~ **to account** məsuliyyətə çağırmaq/dəvət etmək; məsuliyyətə cəlb etmək; izahat tələb etmək; **to** ~ **in evidence** şahidlik etmək/şəhadət vermək üçün məhkəməyə çağırmaq; **to** ~ **in question** 1) sual altında qoymaq, şübhə altına almaq; 2) *hüq.* məhkəməyə çağırmaq; **to** ~ **over the coals** danlamaq, tənbeh etmək; *You will be called over the coals for your conduct Sən / Siz hərəkətlərinə /hərəkətlərinizə görə danlanacaqsan / danlanacaqsınız*

**call-board** ['kɔ:lbɔ:d] *n* elanlar lövhəsi; qatarların hərəkət cədvəli; növbətçilik cədvəli
**call-box** ['kɔ:lbɔks] *n* telefon-avtomat
**call-boy** ['kɔ:lbɔı] *n* 1. xidmətçi oğlan *(mehmanxanada və s.)*; 2. *teatr.* aktyorların səhnəyə çıxma vaxtını deyən oğlan
**caller** ['kɔ:lər] *n* qonaq, görüşə gələn adam, vizit verən
**callet**[1] ['kælıt] *n dial.* 1. əxlaqsız/pozğun qadın; 2. deyingən/danışqan / davakar qadın
**callet**[2] ['kælıt] *v dial.* donquldanmaq, deyinmək, mırtıldamaq, söylənmək
**call-girl** ['kɔ:lgə:l] *n* çağırışa gələn fahişə/qəhbə
**calligraph**[1] ['kə'lıgrəf] *n* kalliqraf, xəttat
**calligraph**[2] ['kælıgra:f] *v* kalliqrafik / gözəl xətlə yazmaq
**calligrapher** ['kə'lıgrəfər] *n* kalliqraf, xəttat
**calligraphic** [.kælı'græfık] *adj* kalliqrafik
**calligraphical** [.kælı'græfıkl] *adj* = **calligraphic**
**calligraphically** [.kælı'græfıkəlı] *adv* kalliqrafik xətlə, kalliqrafik
**calligraphy** [kə'lıgrəfı] *n* kalliqrafiya, xəttatlıq *(gözəl xətlə yazma sənəti)*
**calling**[1] ['kɔ:lıŋ] *n* 1. həvəs, meyl, istedad; **divine** ~ ilahi istedad; *My son has a calling to become a teacher Mənim oğlumun müəllim olmaq meyli/həvəsi var;* 2. sənət; peşə; **to make one's choice of a** ~ özünə sənət / peşə seçmək; *What was his calling? - He was a doctor -Onun sənəti / peşəsi nə idi? O, həkim idi;* 3. çağırma, çağırış *(parlament və s. haq.)*
**calling**[2] ['kɔ:lıŋ] *adj* 1. çağıran, qışqıran, bağıran; ~ **signal** çağıran siqnal; 2. meydan oxuyan; ~ **party** meydan oxuyan tərəf
**callosity** [kæ'lɔsıtı] *n* qabar, döyənək
**callous** ['kæləs] *adj* 1. qabarlı, döyənəkli; ~ **hands** qabarlı əllər; 2. daşürəkli, rəhmsiz, insafsız; **a** ~ **man** daşürəkli/insafsız/ rəhmsiz adam; 3. laqeyd, qayğısız; **a** ~ **answer** laqeyd cavab; ~ **indifference** hissiz laqeydlik; ~ **to criticism** tənqidə laqeyd olan
**calloused** ['kæləst] *adj* qabarlı, qabarla örtülmüş; döyənəkli
**callously** ['kæləslı] *adj* laqeydcəsinə, laqeyd, rəhmsiz bir tərzdə /surətdə; amansızcasına, insafsızcasına, rəhmsizcəsinə
**callousness** ['kæləsnıs] *n* daşürəklilik; rəhmsizlik, insafsızlıq; qabalıq, kobudluq
**callow** ['kælou] *n* 1. tüklənməmiş, ətcə *(quş haq.)*; cavan; 2. yetkinləşməmiş, təcrübəsiz, naşı *(adam haq.)*; ~ **youth** xam /təcrübəsiz/naşı gənc; ~ **orator** təcrübəsiz / naşı / xam natiq
**callowness** ['kælounıs] *n* 1. təcrübəsizlik, naşılıq, xamlıq; 2. gənclik, yetişməməzlik, kallıq
**call-up**[1] ['kɔ:l'ʌp] *n hərb.* hərbi xidmətə çağırış
**call-up**[2] ['kɔ:l'ʌp] *adj:* ~ **plan** *hərb.* hərbi xidmətə çağırış planı
**call-up**[3] ['kɔ:l'ʌp] *v* 1. yada salmaq, xatırlamaq; 2. hərbi xidmətə çağırmaq; *He was called up in 1992 O, 1992-ci ildə hərbi xidmətə çağırıldı;* 3. *amer.* telefon / zəng etmək, zəng vurmaq; *I'll call you up this evening Mən sənə / sizə bu axşam zəng edəcəm / vuracam*
**calm**[1] [ka:m] *n* 1. sakitlik, küləksizlik; 2. *dən.* tam sakitlik *(dənizdə, göldə)*; *There was a calm on the sea Dənizdə bir sakitlik vardı, Dəniz sakit idi;* ~ **before the storm** tufandan əvvəl sakitlik; 3. sükut, səssizlik, dinclik, rahatlıq; 4. asayiş, əmin-amanlıq; arxayınlıq
**calm**[2] [ka:m] *adj* 1. küləksiz, sakit *(hava və s. haq.)*; 2. sakit *(dəniz haq.)*: *The sea was calm Dəniz sakit idi;* 3. rəvan, normal *(nəbz haq.)*; 4. sakit, soyuqqanlı, təlaşa düşməyən, təmkinli *(insan haq.)*; *Pray, be calm! Yalvarıram, sakitləşin / sakit olun!*
**calm**[3] [ka:m] *v* sakitləşdirmək, sakit/rahat /təskin etmək; **to** ~ **oneself** sakitləşmək; **to** ~ **a child** uşağı sakitləşdirmək; *Calm yourself! Sakitləş!, Sakitləşin!*
**calm down** ['ka:mdaun] *v* sakitləşmək; sakitləşdirmək; *The excited girl quickly calmed down Həyəcanlanmış qız tezliklə sakitləşdi; At last the wind calmed down Nəhayət külək sakitləşdi; I'll go and calm your angry brother down Mən gedib sənin / sizin acıqlı qardaşını/qardaşınızı sakitləşdirəcəm*
**calmant** ['kælmənt] *n əcz.* sakitləşdirici vasitə
**calmative** ['kælmətıv] *n* = **calmant**
**calmness** ['ka:mnıs] *n* 1. sakitlik, sükut; 2. soyuqqanlılıq, təmkin, özünü itirməmə
**caloric** [kə'lɔrık] *adj fiz.* istilik; kalorili; ~ **content** kalorilik, kalori miqdarı; ~ **unit** kaloriya, istilik vahidi; ~ **value / capacity** kalorilik, istilik yaratma qabiliyyəti/tutumu
**caloricity** [.kælə'rısıtı] *n fiz.* istilik doğurma / yaratma qabiliyyəti; kalorilik
**calorie** ['kælərı] *n fiz.* 1. kalori *(istilik miqdarı vahidi)*; **great / small** ~ böyük / kiçik kalori; **low** ~ **food** az kalorili ərzaq; 2. yeməyin yaratdığı kalori; *One thin piece of bread has 90 calories Bir nazik parça çörək 90 kaloriyə malikdir;*
◊ **to watch one's** ~**s** *amer.* rejim saxlamaq, yeməyini həddində saxlamaq, çox kalorili ərzaq yeməmək
**calorific** [.kælə'rıfık] *adj fiz.* istilik yaradan, istilik; ~ **value** istilik yaratma/doğurma qabiliyyəti; *This coal has a high calorific value Bu kömürün yüksək istilik yaratma keyfiyyəti var;* ~ **capacity** istilik tutumu
**calorification** [kə.lɔrıfı'keıʃn] *n fiz.* istilik ayrılması
**calorifics** [.kælə'rıfıks] *n* istilik texnikası
**calorifier** [kə'lɔrıfaıər] *n* qızdırıcı cihaz
**calorimeter** [.kælə'rımıtər] *n fiz.* kalorimetr *(kalori miqdarını ölçən cihaz)*
**calorimetry** [.kælə'rımıtrı] *n fiz.* kalorimetriya *(fizikanın cismin buraxdığı və udduğu istilik miqdarını ölçməklə məşğul olan bölməsi)*



**calory** ['kælərı] *n* = **caloric**
**calumniate** [kə'lʌmnıeıt] *v* 1. böhtan/şər atmaq, iftira etmək; dalınca danışmaq, qeybət etmək; böhtan yaymaq; 2. pisləmək, ləkələmək, bədnam etmək
**calumniation** [kə.lʌmnı'eıʃn] *n* böhtan, şər; yalan / uydurma ittiham
**calumnious** [kə'lʌmnıəs] *adj* böhtanlı, şərli, böhtanla / şərlə / iftira ilə dolu
**calumny** ['kæləmnı] *n* 1. böhtan, şər, iftira; **to spread calumnies** böhtan/şər/iftira yaymaq; 2. *hüq.* yalan/uydurulmuş ittiham
**calve** [ka:v] *v* buzovlamaq; doğmaq, balalamaq, bala doğmaq *(inək, fil, balina və s. haq.)*
**calver** ['ka:vər] *n* boğaz inək
**calves** [ka:vz] **calf** *isminin cəm forması*
**calving** ['ka:vıŋ] *n* buzovlama; doğma, balalama *(inək, fil və s. haq.)*
**calvinism** ['kælvınızm] *n din.* kalvinizm *(XVI əsrdə İsveçrədə meydana gəlmiş protestant məzhəblərindən biri)*
**calvinist** ['kælvınıst] *n* kalvinist *(kalvinizm məzhəbinə mənsub adam)*
**calvish** ['ka:vıʃ] *adj* gicbəsər, gictəhər, küttəhər
**came** [keım] **to come** *felinin pt forması*
**camel** ['kæməl] *n zool.* dəvə; **Arabian** ~ ərəb dəvəsi, birhürgüclü dəvə; **Bactrian** ~ ikihürgüclü dəvə
**camel-back** ['kæməlbæk] *adj* qozbel; donqar
**camel-bird** ['kæməlbə:d] *n zool.* dəvəquşu
**camelcade** ['kæməlkeıd] *n* dəvə karvanı
**cameleer** [.kæmı'lıər] *n* dəvə sürən, sarban, sarvan, dəvəçi
**camel-hair** ['kæməlheər] *n* = **camel's hair**
**camelish** ['kæməlıʃ] *n* dəvə kimi inadkar
**camellia** [kə'mı:ljə] *n bot.* kameliya *(çiçək)*
**camel's hair** ['kæməlz'heər] *n* 1. dəvəyunu; dəvə qılı; 2. dəvə yunundan toxunmuş parça
**camera** ['kæmərə] *n* 1. fotoaparat; fotokamera, fotoqrafiya aparatı; 2. kino aparatı, kinokamera; 3. televiziya verilişi kamerası;
◊ **to be** ~ **shy** fotokamera/kinokamera / telekamera qarşısında özünü itirmək
**cameraman** ['kæmərəmæn] *n (pl* **-men** [-mən]) 1. fotoqraf, fotoqrafçı; 2. kinooperator; 3. fotoaparat satan adam
**camerawork** ['kæmərəwə:k] *n* kino / film çəkmə, kinoçəkmə işi
**camerist** ['kæmərıst] *n amer.* fotoqraf
**cami-knickers** ['kæm.ınıkəz] *n pl* qadın kombinasiyası; *She was wearing a pair of cami-knickers O, kombinasiya geyinmişdi, Onun əynində kombinasiya vardı*
**camisole** ['kæmısoul] *n* 1. lifçik, döşlük; 2. kofta *(yataqda, evdə geyilən)*; 3. *tib.* dəli köynəyi *(coşğun dəlilərə geydirilən xüsusi paltar)*; 4. *arx.* fufayka *(toxunma isti köynək)*; gödəkçə *(kişilər üçün)*
**camomile** ['kæməmaıl] *n bot.* 1. çobanyastığı, mollabaşı; 2. çobanyastığından hazırlanmış dərman
**camouflage**[1] ['kæmufla:ʒ] *n* 1. gizlətmə, gizlədilmə; kamuflaj *(binanı, təyyarəni, topu və sairəni maskalamaq üçün onları xüsusi rənglə boyama üsulu)*; 2. biclik, hiyləgərlik, hiylə, fənd; gözdən pərdə asma, aldatma, yalan
**camouflage**[2] ['kæmufla:ʒ] *v* 1. maskalamaq; 2. gizlətmək, üstünü ört-basdır etmək / pərdələmək *(məqsədi və s.)*; *The military vehicles were camouflaged Hərbi nəqliyyat vasitələri maskalanmışdı / gizlədilmişdi;* 3. gözdən pərdə asmaqla məşğul olmaq, biclik etmək
**camouflet** [.ka:mu:'fleı] *n* 1. *hərb.* kamuflet *(yeraltı mina partlayışı)*; 2. *məc.* hiylə, kələk
**camp**[1] [kæmp] *n* I 1. düşərgə *(idman, uşaq və s. üçün)*; **base** ~ baza, əsas düşərgə; *When we were on holiday, we stayed in a camp İstirahətdə olarkən biz düşərgədə qaldıq;* **open** ~ *id.* açıq hava düşərgəsi; **summer** ~ yay düşərgəsi *(uşaqlar, gənclər üçün)*; **concentration** ~ həbs düşərgəsi *(həbs yerləri)*; **death** ~ ölüm düşərgəsi; **prison** ~ hərbi əsirlər və ya dustaqlar üçün düşərgə; 2. *amer.* bağ, villa, şəhərkənarı ev; yay iqamətgahı; **to go to a summer** ~ bağa/yay iqamətgahına getmək; *He is going to a summer camp O, bağa gedir;* 3. düşərgə, lager; tərəf; **opposition** ~ müxalifət düşərgəsi/lageri; **to be in different** ~**s** müxtəlif lagerlərdə olmaq; 4. əsgər həyatı; hərbi xidmət; ordu; **to follow the** ~ ordunun arxasınca getmək
**camp** [kæmp] *n* II süni həyəcan, qızışma, özündən çıxma, sünilik
**camp**[2] [kæmp] *adj* I düşərgə; ~ **site** düşərgənin yerləşdiyi yer; turbaza; kempinq; ~ **commander** düşərgə rəisi; ~ **service** *hərb.* düşərgə xidməti; ~ **hospital** *hərb.* düşərgə qospitalı / xəstəxanası; ~ **bed** düşərgə çarpayısı; ~ **chair** düşərgə stulu *(açılıb-örtülən yüngül stul)*; ~ **telephone** *hərb.* düşərgə/səyyar telefon; ~ **stove** *amer.* səyyar mətbəx
**camp** [kæmp] *adj* II 1. homoseksual; 2. qadınabənzər, arvadaoxşar, qadın/arvad kimi davranan; 3. qeyri-təbii, süni, mübaliğəli
**camp**[3] [kæmp] *v* düşərgə salmaq, düşərgədə yerləşmək; **to** ~ **down** çadır qurmaq; **to go** ~**ing** düşərgədə yaşamaq
**campaign**[1] [kæm'peın] *n* 1. *hərb.* yürüş; hərbi əməliyyat; *The campaign to seize Moscow was a failure Moskvanı zəbt etmək yürüşü boşa çıxdı;* 2. kampaniya, mübarizə; **electoral** ~ seçki kampaniyası, seçkiqabağı mübarizə; *The campaign succeeded and he won the election Seçki kampaniyası uğurlu oldu və o, seçkidə qalib gəldi;* ~ **against cancer** *tib.* xərçəngə qarşı mübarizə kampaniyası
**campaign**[2] [kæm'peın] *adj:* ~ **conditions** yürüş

vəziyyəti; ~ **medal** hərbi yürüşdə / əməliyyatda iştiraka görə medal; ~ **biography** *amer.* seçkidə iştirak edən namizədin tərcümeyi-halı *(xüsusən prezidentlik seçkisində)*; ~ **text-book** seçki kampaniyası üçün materiallar toplusu

**campaign³** [kæm'peɪn] *v* **1.** *hərb.* yürüşdə / hərbi əməliyyatda iştirak etmək; **2.** kampaniya keçirmək; **to ~ for** *smb.* bir kəs üçün təbliğat aparmaq *(seçkidə)*; **3.** mübarizə aparmaq; *Jane is campaigning for equal rights for women Ceyn qadınların bərabər hüquqa malik olmaları uğrunda mübarizə aparır*

**campaigner** [kæm'peɪnəʳ] *n* yürüş / əməliyyat iştirakçısı; **old ~** hərbi yürüşdə iştirak etmiş veteran, köhnə qulluqçu

**campanula** [kəm'pænjulə] *n bot.* zəngçiçəyi

**camper** ['kæmpəʳ] *n* **1.** düşərgə sakini, düşərgədə yaşayan adam; turist; **2.** bağçı, bağda yaşayan adam, yaylaqçı

**campfire** ['kæmpfaɪəʳ] *n* düşərgə tonqalı

**camphor** ['kæmfəʳ] *n əcz.* kamfora, kafur *(təbabətdə və texnikada işlədilən kəskin qoxulu maddə)*

**camphorated** ['kæmfəreɪtɪd] *adj* kamforlu, tərkibində kamfora / kafur olan; ~ **oil** kamfora / kafur yağı

**campus¹** ['kæmpəs] *n* **1.** universitetin/kollecin və s. ərazisi; **2.** *d.d.* universitet, kollec

**campus²** ['kæmpəs] *adj:* ~ **life** tələbəlik həyatı; ~ **paper** universitet qəzeti; ~ **English** İngilis tələbə jarqonu

**can¹** [kæn] *n* **1.** dəmir qutu, dəmir banka; **2.** *amer.* konserv qutusu və ya bankası; **3.** bidon *(mayelər üçün dəmir qab)*; **4.** kanistr *(benzin, yağ və s. üçün bak)*; **5.** krujka, parç, birəlli; tayqulp *(su qabı)*; dolça; **6.** susəpələyən, susəpən *(cihaz)*; **7.** *amer.* zibil qutusu

**can²** [kæn] *v* I **1.** konservləşdirmək, konserv hazırlamaq; **2.** bidona tökmək; **3.** *amer. jarq.* həbsxanaya/qazamata salmaq; **4.** *amer. jarq.* qurtarmaq, kəsmək, dayandırmaq, saxlamaq; *Can it! Qurtar! Qurtarın! Sus! Susun!*

**can** [kæn] *(tam forma)*; [kən, kn] *(qısa formalar)* *v* II *(pt forması:* **could**; *inkar forması* **cannot, can't**)*: Bu fel aşağıdakı mənaları ifadə edir:* **1)** *təbii bacarıq və qabiliyyət*: bacarmaq, bilmək *felləri ilə tərcümə edilir: I can swim Mən üzməyi bacarıram, Mən üzə bilirəm; She can't cook O, xörək bişirə bilmir, O, xörək bişirməyi bacarmır; Can they speak English? Onlar ingilis dilində danışa bilirlərmi, Onlar ingilis dilində danışmağı bacarırlarmı? The child can read and write in English Uşaq ingiliscə danışa və yaza bilir, Uşaq ingiliscə danışmağı və yazmağı bacarır;* **2)** *mənəvi hüquq:* ixtiyarı olmaq, haqqı olmaq *söz birləşmələri ilə tərcümə edilir: I can't very well accept this offer Mənim bu təklifi qəbul etməyə haqqım / ixtiyarım yoxdur; I can hardly go away and leave you alone Mən səni/sizi tək buraxıb gedə bilmərəm (ixtiyarım yoxdur); The Lower House alone can initiate financial measures Ancaq aşağı palatanın maliyyə haqqında qanun layihəsi təqdim etmək hüququ var;* **3)** *amer. d.d.* xahiş, müraciət *(sual cümlələrində). Bu halda* **can** *feli əksərən Azərbaycan türkcəsinə tərcümə edilmir və sual cümləsi nəqli cümləyə çevrilir: Can I have some more bread, please? Zəhmət olmasa, mənə bir az da çörək verin;* **4)** icazə: **-a, -ə+bil-** *(təsdiq və inkar cümlələrdə): You can go now İndi sən/siz gedə bilərsən/bilərsiniz; You can cross the street here Sən/Siz küçəni buradan keçə bilərsən/ bilərsiniz;* **5)** şübhə: **-a/-ə+bil-** *(sual və inkar cümlələrdə): Can it be true? Bu, həqiqət ola bilərmi? Bu doğrumu? She can't have done it Ola bilməz ki, o bunu etmiş olsun*

**Canadian¹** [kə'neɪdjən] *n* kanadalı, Kanada vətəndaşı; **the ~s** *top.i.* kanadalılar; **French ~s** fransız dilində danışan kanadalılar, fransız mənşəli kanadalılar

**Canadian²** [kə'neɪdjən] *adj* Kanada; ~ **forests** Kanada meşələri; ~ **wheat** Kanada buğdası

**canal¹** [kə'næl] *n* **1.** kanal; **irrigation ~s** suvarma kanalları; *The Panama canal joins 2 oceans Panama kanalı 2 okeanı birləşdirir;* **2.** qanov, ensiz arx, xəndək; çuxur; **3.** *anat.* gödən

**canal²** [kə'næl] *adj* kanal; ~ **boat** kanal qayığı *(kanalda istifadə edilən)*; ~ **dues** kanaldan keçmək üçün yığılan rüsum

**canal³** [kə'næl] *v* kanalla / kanal vasitəsilə keçirmək; kanal vasitəsilə birləşdirmək

**canalization, -isation** [ˌkænəlaɪ'zeɪʃn] *n* **1.** kanal çəkmə; **2.** kanallar sistemi; **3.** kanalizasiya

**canalize, -ise** ['kænəlaɪz] *v* **1.** kanal çəkmək; **2.** dərinləşdirmək, genişləndirmək *(çayı); By canalizing the river they prevented flooding Çayı genişləndirməklə onlar daşqının qarşısını aldılar;* **3.** müəyyən məcraya / istiqamətə salmaq, müəyyən istiqamətə yönəltmək; **to ~ public opinion** ictimai fikri / rəyi müəyyən istiqamətə yönəltmək; *If we want to influence the government, we must canalize our efforts to one particular purpose Əgər hökumətə təsir etmək istəyiriksə, biz səylərimizi bir məqsədə yönəltməliyik*

**canape** [ˌka:na:'peɪ] *n amer.* üstünə kürü/pendir /balıq/ət və s. qoyulub qızardılmış bir parça çörək

**canard** [kæ'na:d] *n* şayiə, uydurma, yalan xəbər

**canary¹** [kə'neərɪ] *n* **1.** = **canary bird**; **2.** açıq-sarı rəng; **3.** *amer. jarq.* kanari *(qədim rəqs)*; **4.** Kanar adalarında istehsal edilən ağ şirin şərab

**canary²** [kə'neərɪ] *adj* açıq-sarı

**canary bird** [kə'neərɪbə:d] *n zool.* sarıbülbül, kanarya quşu

**canary-grass** [kə'neərɪgra:s] *n bot.* bülbülotu

**canary-seed** [kə'neərɪsi:d] *n* bülbül dəni *(yem)*

**canasta** [kə'næstə] *n* kanasta *(kart oyunu)*



**canaster** [kə'næstəʳ] *n* kanaster *(tünd tütün)*

**cancan** ['kænkæn] *n* rəqs növü *(nalayiq bədən hərəkətləri ilə ifa edilən rəqs, xüs. Fransada)*

**cancel¹** ['kænsl] *n* **1.** pozma, qaralama; pozulma, qaralanma, qələm çəkmə/çəkilmə, silmə, silinmə; **2.** ləğv etmə /edilmə; **3.** *mus.* bekar *(not yazısında əvvəlki diez və bemolun təsirini ləğv və notun əsas mənasını bərpa edən işarə)*

**cancel²** ['kænsl] *v* (**-ll-**) **1.** pozmaq, qaralamaq, silmək; **2.** ləğv etmək; geri götürmək; **to ~ a treaty** müqaviləni ləğv etmək; **to ~ a debt** borcu ləğv etmək; **to ~ an order** sifarişi geri götürmək; *She cancelled her order for a new car O, yeni maşın almaq haqqındakı sifarişini geri götürdü;* **to ~ a contract** bağlaşmanı / müqaviləni ləğv etmək; **3.** *riyaz.* ixtisar etmək, ixtisara salmaq

**cancellation** [ˌkænse'leɪʃn] *n* **1.** pozma, qaralama, silmə; pozulma, qaralanma, silinmə; **2.** ləğv etmə; dayandırma; ~ **of race** startın dayandırılması *(yelkənli idmanda)*; **3.** ödəmə *(borcu)*, ödənmə, ödəniş *(borcu marka almaqla)*; **4.** *riyaz.* ixtisar etmə / edilmə, ixtisar olunma; ixtisar

**cancer¹** ['kænsəʳ] *n tib.* xərçəng

**cancer²** [kænsəʳ] *adj* xərçəng; ~ **activity/ control** *tib.* xərçəngə qarşı tədbirlər; xərçəngə qarşı mübarizə; ~ **carrier/case** xərçəng xəstəliyinə tutulmuş xəstə; ~ **detection centre** *tib.* onkoloji mərkəz / məntəqə; ~ **research** xərçəng xəstəliyi üzrə aparılan tədqiqat

**cancerate** ['kænsəreɪt] *v tib.* xərçəng xüsusiyyəti kəsb etmək

**canceration** [ˌkænsə'reɪʃn] *n tib.* xərçəng şişinin inkişafı, bədxassəli şiş əlamətlərinin aşkar olunması

**cancerous** ['kænsərəs] *adj* **1.** *tib.* xərçəng, yaman; ~ **tumour** xərçəng şişi; **2.** fəsadlı, zərərli; *He had a cancerous growth on his neck Onun boynunda fəsadlı xərçəng şişi vardı*

**cancroid** ['kæŋkrɔɪd] *n tib.* dəri xərçəngi

**candid** ['kændɪd] *adj* səmimi, ürəyiaçıq; aşkar, apaşkar; təmizürəkli, açıqürəkli; açıq; **to be ~** səmimi olmaq; açıq danışmaq; *He was not candid with me O mənə qarşı səmimi olmadı; Let's be candid Gəl/Gəlin açıq danışaq*

**candidacy** ['kændɪdəsɪ] *n* namizədlik

**candidate** ['kændɪdɪt] *n* namizəd; **the Republican ~ for governor** qubernatorluğa Respublikaçı partiyasının namizədi

**candidly** ['kændɪdlɪ] *adv* səmimi, səmimiyyətlə, təmizürəklə, açıqürəklə, açıq; **to speak to** *smb.* ~ bir kəslə açıq / səmimi danışmaq; *He spoke to me candidly O mənimlə açıq / səmimi danışdı*

**candidness** ['kændɪdnɪs] *n* səmimilik, səmimiyyət; açıqürəklilik

**candied** ['kændɪd] *adj* **1.** şəkərlənmiş, şəkərli *(meyvə və s. haq.)*; ~ **peel** şəkərlənmiş meyvə qabığı; **2.** xarlamış *(mürəbbə və s. haq.)*; **3.** bal kimi, şirin; ~ **tongue** şirin dil

**candle** ['kændl] *n* şam; **wax ~** mum şamı, mumdan hazırlanmış şam; **tallow ~** piy şamı, piydən hazırlanmış şam;

◊ **to hold a ~ to** *smb.* bir kəsə kömək etmək; **to hold a ~ to the devil** ≅ **1)** həqiqi yolundan çıxarmaq / azdırmaq; **2)** cinayətə kömək etmək; **to burn the ~ at both ends 1)** pozğun həyat keçirmək, ömrünü puç eləmək; **2)** gücünü / sağlamlığını mənasız yerə sərf etmək; *The game is not worth the candle ≅ Zəhmətinə dəyməz, Qoyulan xərcə dəyməz*

**candle-light** ['kændllaɪt] *n* **1.** şam işığı, şamla işıqlandırma/işıqlandırılma; **to dine by ~** şam işığında nahar etmək; **to dress by ~** şam işığında geyinmək; **2.** toran, alaqaranlıq

**candle-lighter** ['kændlˌlaɪtəʳ] *n* kilsədə şam yandıran *(adam)*

**candle-power** ['kændlˌpauəʳ] *n* işıq gücü *What is the candlepower of this lamp? Bu lampanın işıq gücü neçədir? Bu lampa neçə şamlıqdır?*

**candlestick** ['kændlˌstɪk] *n* şamdan

**candlewick** ['kændlˌwɪk] *n* **1.** şam piltəsi; **2.** xüsusi sapla vurulmuş qabarıq naxış *(xüs. çarpayı örtüyünə)*; **3.** qabarıq naxışlı parça; *This covering was made of candlewick Bu örtük naxışlı parçadan tikilib*

**candor** ['kændəʳ] *n amer.* = **candour**

**candour** ['kændəʳ] *n* **1.** səmimilik, ürəyiaçıqlıq, səmimiyyət; doğruluq, düzlük, açıqlıq; **2.** *d.d.* mehribanlıq, mərhəmət, xoşxasiyyətlilik, rəhmdillik; **3.** *d.d.* təmizlik, saflıq

**candy¹** ['kændɪ] *n* **1.** nabat *(şirni)*; **2.** *amer.* konfet; mixed candies konfet yığını; assorti

**candy²** ['kændɪ] *adj* konfet, qənnadı; ~ **store** konfet / qənnadı dükanı;

◊ **like taking ~ from a baby** *amer.* ən asanı, ən sadəsi

**candy³** ['kændɪ] *v* **1.** qənddə bişirmək; **2.** xarlandırmaq, qəndə qoymaq *(meyvəni)*; **3.** xarlanmaq, şəkərlənmək *(mürəbbə və s. haq.)*

**cane¹** [keɪn] *n* **1.** qamış; qarğı; **2.** tənək, meynə; kol-kosun gövdəsi; **3.** əl ağacı; **4.** *amer.* ağac, əsa; **5.** qənd /şəkər qamışı

**cane²** [keɪn] *adj* qamış; ~ **sugar** qamış qəndi/şəkəri; ~ **furniture** qamışdan hörülmüş mebel/avadanlıq

**cane³** [keɪn] *v* **1.** əl ağacı / əsa ilə vurmaq / döymək; cəzalandırmaq, cəza vermək; *The teacher used to cane me when I behaved badly Mən özümü pis aparanda müəllim məni cəzalandırardı; I got a good caning for coming to school late Məktəbə gec gəldiyimə görə mən yaxşıca cəzalandırıldım;* **2.** qamışla hörmək

**cane-chair** ['keɪntʃeəʳ] *n* qamışdan hörülmüş stul / kreslo

**canella** [kə'nelə] *n* darçın

**cane-mill** ['keɪnmɪl] *n* press *(qamışı sıxıb şirəsini çıxarmaq üçün)*

**canescent** [kə'nesənt] *adj* çaltəhər, bozumtul ağ, bir qədər çallaşmış
**canine**$^{1}$ ['kænaın] *n* **1**. *anat.* köpək dişi; **2**. diş *(heyvanlarda)*
**canine**$^{2}$ ['kænaın] *adj* it; köpək; ~ **distemper** *tib.* it taunu; ~ **madness / rabies** *tib.* it quduzluğu
**caniniform** [kə'naınıfɔ:m] *adj* köpək dişi formasında, köpək dişinə oxşar
**canister** ['kænıstəʳ] *n* **1**. çayqabı, çayrız; kofe, ədviyyat və s. üçün banka; **2**. kanistr *(benzin, yağ və s. üçün bak)*; **3**. səbət *(çörək, gül üçün)*; **4**. *hərb.* əleyhqazın qutusu
**cank** [kæŋk] *v dial.* **1**. qağıldamaq *(qaz kimi)*, qaqqıldamaq; **2**. *məc.* dil boğaza qoymamaq, kiriməmək; naqqallıq / boşboğazlıq etmək, çərənləmək
**canker**$^{1}$ ['kæŋkəʳ] *n* **1**. *tib.* yara, xora; **2**. *tib.* süd yarası, ağız gəlməsi; **3**. *tib.* stomatit *(ağızın selikli qişasının iltihabı)*
**canker**$^{2}$ ['kæŋkəʳ] *v* **1**. yemək, korlamaq, xarab etmək *(pas, turşu və s.)*; **2**. yoluxdurmaq; **3**. tələf/məhv etmək; əxlaqını korlamaq; **4**. yeyilməyə məruz qalmaq / düçar olmaq; **5**. çürümək, çürüyüb dağılmaq
**canker-berry** ['kæŋkə.berı] *n* itburnu meyvəsi
**canker-bloom** ['kæŋkəblu:m] *n* itburnu çiçəyi
**cankered** ['kæŋkəd] *adj* **1**. yeyilmiş; yara basmış; **2**. xəstəliyə yoluxmuş; çürümüş; **3**. çox pis, fəsad, zərərli; qəzəbli, acıqlı, kinli, paxıl
**cankerous** ['kæŋkərəs] *adj* **1**. yeyən; **2**. məhvedici, öldürücü, tələfedici, həlakedici, zərərli; ziyanlı, xətərli, çox zərərli / ziyanlı; fəlakətli; **3**. yoluxucu, yoluxan
**cankerworm** ['kæŋkəwə:m] *n* meyvə qurdu
**canned** [kænd] *adj* konservləşdirilmiş; ~ **goods** konservləşdirilmiş ərzaq, konservlər; ~ **fish** balıq konservi; ~ **meat** konservləşdirilmiş ət, ət konservi
**cannery** ['kænərı] *n* konserv zavodu
**cannibal**$^{1}$ ['kænıbəl] *n* **1**. kannibal, adamyeyən; **2**. insansevməz, insan düşməni, insana nifrət bəsləyən
**cannibal**$^{2}$ ['kænıbəl] *adj* adamyeyən, kannibal; ~ **tribe** adamyeyən qəbilə; ~ **policy** insana nifrət siyasəti
**cannibalic** [.kænı'bælık] *adj* **1**. kannibal, adamyeyən; **2**. insanlığa zidd, vəhşicəsinə, vəhşiyanə
**cannibalizm** ['kænıbəlızm] *n* kannibalizm, vəhşilik, yırtıcılıq
**cannibalize, -ise** ['kænıbəlaız] *v zədələnmiş maşından müəyyən hissəni çıxarıb eyni qəbildən olan maşını təmir etmək*
**cannily** ['kænılı] *adv* **1**. ağılla, kamalla, tədbirlə, ehtiyatla; **2**. işgüzarlıqla, bacarıqla; **3**. cəld; **4**. rahatlıqla; **5**. qənaətlə; **6**. hiyləgərliklə, bicliklə, kələkbazlıqla
**cannon**$^{1}$ ['kænən] *n* **1**. top; kiçik kalibrli avtomatik top; *The general decided to use cannon against the enemy General düşmənə qarşı topdan istifadə etməyi qərara aldı;* **2**. təyyarədən atəş açmaq üçün güclü top; *Our fighter planes are all armed with cannon Bizim qırıcı təyyarələrimizin hamısı güclü toplarla silahlanıb*
**cannon**$^{2}$ ['kænən] *v* **1**. topdan atəş açmaq, topa tutmaq; **2**. toxunarkən geri sıçramaq / tullanmaq; **3**. (**with**) toqquşmaq, toxunmaq; **to ~ against / into** ***smb.*** bir kəslə toqquşmaq
**cannonade**$^{1}$ [.kænə'neıd] *n* iri toplardan aramsız açılan atəş; *Much of the city was destroyed in the cannonade Şəhərin əksər hissələri iri toplardan açılan aramsız top atəşindən dağıdıldı*
**cannonade**$^{2}$ [.kænə'neıd] *v* toplardan atəşə tutmaq, topa tutmaq
**cannonball** ['kænənbɔ:l] *n tar.* girdəşəkilli top gülləsi *(qədim zamanlarda istifadə edilən)*
**cannon fodder** ['kænən.fɔdəʳ] *n* topəti *(havayı qırğına verilən qoşun / əsgərlər)*
**cannon-bone** ['kænənboun] *n anat.* baldır sümüyü
**cannoned** ['kænənd] *adj* topla silahlanmış
**cannon-proof** ['kænənpru:f] *adj* top gülləsi deşməyən / götürməyən
**cannonry** ['kænənrı] *n* **1**. *top.i.* top, artilleriya; **2**. güclü top atəşi, topa tutma
**cannot** ['kænɔt] **can** *felinin indiki zaman inkar forması (əsasən yazıda işlənir)*
**canny** ['kænı] *adj* (**-ier, -iest**) **1**. ağıllı, kamallı; işgüzar, bacarıqlı, təcrübəli; **2**. sərfəli, əlverişli; **3**. ehtiyatlı, tədbirli, soyuqqanlı, sakit; **4**. rahat; **5**. xoşagələn, cəzbedici, qəşəng, gözoxşayan; **6**. qənaətçi, qənaətcil; sərfəli; **7**. *arx.* bic, hiyləgər, kələkbaz, fəndgir; məkrli, xain; **8**. irihəcmli, kifayət qədər böyük
**canoe**$^{1}$ [kə'nu:] *n* baydarka *(dar və yüngül idman qayığı)*; kanoe *(yüngül idman qayığı)*;
◊ **to paddle** ***one's*** **own ~** yalnız özünə inanmaq / güvənmək, öz yolu ilə getmək, heç kəsdən asılı olmamaq
**canoe**$^{2}$ [kə'nu:] *v* baydarkada üzmək
**canoeing** [kə'nu:ıŋ] *n id.* baydarka yarışı
**cannoe-pair** [kə'nu:peəʳ] *n id.* ikiavarlı baydarka
**canoe-single** [kə'nu:sıŋgl] *n id.* biravarlı baydarka
**canon** ['kænən] *n* **1**. qayda, qanun, qayda-qanun; **ethical ~** əxlaq qanunları, etik qaydalar; **2**. meyar; **~s of criticism** tənqid meyarları; **3**. *ədəb.* **classical ~** klassik qaydalar / üsullar
**canonical** [kə'nɔnıkəl] *adj* **1**. qanuna / qaydaya uyğun; **2**. qəti müəyyən edilmiş, nümunə olaraq qəbul edilmiş; nümunə kimi qəbul edilmiş
**canonicals** [kə'nɔnıkəlz] *n pl* ibadət zamanı keşişlərin geydiyi libas
**canonize, -ise** ['kænənaız] *v kils.* **1**. təsdiq etmək, qanuna salmaq, qanunlaşdırmaq; **2**. *din.* müqəddəs hesab etmək, kilsə tərəfindən övliyalar sırasına keçirmək; **3**. *arx.* ilahiləşdirmək, təqdis etmək; **4**. pərəstiş / sitayiş etmək
**canonry** ['kænənrı] *n kils.* keşiş vəzifəsi / rütbəsi
**canoodle** [kə'nu:dl] *v d.d.* **1**. oxşamaq, əzizləmək, nazlamaq; həzz/zövq vermək; **2**. nazı ilə oynamaq, incə rəftar etmək; **3**. qucaqlaşmaq, bir-birinə sığınmaq/sarmaşmaq *(xüs. kişi və qadın haq.)*; *Tom and Jane were canoodling in the back row of the cinema Tom və Ceyn kinoteatrın axırıncı sırasında qucaqlaşmışdılar*



**canopy**$^{1}$ ['kænəpı] *n* **1**. örtü, örtük; tent; **cloud ~** bulud örtüyü; **2**. alaçıq, xeymə; **~ of leaves** yarpaqdan tikilmiş alaçıq/xeymə; **3**. qübbə; günbəz; **the ~ of heaven** göy qübbəsi; **to dwell under the ~** açıq səma altında yaşamaq; **4**. *av.* **1**) paraşütün qübbəsi; **2**) təyyarənin kabinəsində fənər
**canopy**$^{2}$ ['kænəpı] *v* tentlə /örtüklə örtmək
**can't** [ka:nt] *d.d.* **cannot**-*un qısa forması*
**cant**$^{1}$ [kænt] *n* I **1**. yan taxta *(qapı və ya pəncərənin çərçivəsində)*; **2**. *tex.* çəpləndirilmiş kənar; çəplik, çəpləşdirmə, çəpləşmə; tiyənin ağzı *(iti tərəfi)*; *Ships usually have a cant so that water will run off Gəmilərdə suyun axıb getməsi üçün bir qayda olaraq çəplik olur;* **3**. maillik, meyl, yatıqlıq; eniş; mail vəziyyət; **4**. təkan, zərbə; *The bus gave a cant and an old lady fell down Avtobus təkan verdi və yaşlı xanım yıxıldı;* **to give a ball a ~** ≅ topa zərbə vurmaq; **5**. yonulmuş tir / şalban
**cant** [kænt] *n* II **1**. jarqon, arqo *(kiçik bir ictimai qrupun, ümumi milli dildən ayrı olan şərti jarqonu)*; gizli dil; **thieves' ~** oğruların jarqonu; oğru / cani jarqonu; **2**. şablon ifadə; **3**. riyakarlıq, riyakar hərəkət, ikiüzlülük
**cant**$^{2}$ [kænt] *v* I **1**. çəpləşdirmək, meylləndirmək; maili vəziyyətə salmaq; **2**. əyilmək, meyl etmək, maili vəziyyət almaq; **3**. çevrilmək; arxası üstə çevrilmək
**cant** [kænt] *v* II **1**. jarqon dilində danışmaq; **2**. riyakarlıqla/ikiüzlülüklə danışmaq, ikiüzlülük / riyakarlıq etmək; **3**. yalvarmaq, yalvarıb almaq, üzünün suyunu tökərək almaq *(dilənçi haq.)*; **4**. söymək; şər atmaq
**cantankerous** [kən'tæŋkərəs] *adj d.d.* deyingən, danışqan, davakar, dalaşqan, cəncəl, öcəşkən; hər şeyə irad tutan, bəhanəçi, bəhanə axtaran, bədrəftar, qılıqsız; **a ~ old man** deyingən qoca qadın
**cantankerously** [kən'tæŋkərəslı] *adv* davakarcasına, öcəşkənliklə, böhtancasına, mənasız /cəfəng bir tərzdə
**cantankerousness** [.kən'tæŋkərəsnıs] *n* deyingənlik, davakarlıq, dalaşqanlıq, cəncəllik, öcəşkənlik
**cantata** [kæn'ta:tə] *n* kantata *(musiqi əsərinin xorla oxunan təntənəli hissəsi)*
**canteen** [kæn'ti:n] *n* **1**. yeməkxana, bufet *(təhsil müəssisələrində, zavodda və s.)*; **2**. mətbəx ləvazimatı yığılmış səyyar qutu / yeşik; **3**. mehtərə *(çiyindən asılan su qabı)*; **4**. hərbi mağaza, ordu dükanı
**canter** ['kæntəʳ] *n* **1**. jarqonda danışan *(adam)*; **2**. ikiüzlü, riyakar *(adam)*; **3**. *arx.* sərsəri, səfil, avara
**cantinier** [.kæntı'nje] *n fr.* aşxanaçı, meyxanaçı, aşxana/meyxana sahibi
**cantiniere** [.kæntı'njer] *n* aşxanaçı qadın, meyxana sahibəsi
**cantle** ['kæntl] *n* dilim, fal *(çörək)*; parça, tikə *(tort, pendir)*; dilim *(apelsin)*
**cantlet** ['kæntlıt] *n* kiçik / balaca parça
**canvas**$^{1}$ ['kænvəs] *n* **1**. qalın kətan, giş; **2**. yağlı boyalarla çəkilmiş şəkil; **3**. parusin *(qalın kətan parça)*; **4**. brezent *(su keçirməyən parça)*; **5**. yelkən
**canvas**$^{2}$ ['kænvəs] *v* **1**. kətanla / brezentlə örtmək; **2**. yelkənlə təmin etmək
**canvass**$^{1}$ ['kænvəs] *n* **1**. səs toplama *(seçki ərəfəsində)*; seçkiqabağı təşviqat; **2**. müzakirə, təhlil *(təfərrüatı ilə)*; **3**. *amer.* səslərin rəsmi hesablanması; seçkilərin nəticəsinin yoxlanması və təsdiqi *(seçki komissiyaları tərəfindən)*; **4**. sorğu *(xalq arasında aparılan)*; seçmə yolu ilə ictimai rəyi müəyyənləşdirmə
**canvass**$^{2}$ ['kænvəs] *v* **1**. səs toplamaq *(seçkiqabağı)*; namizəd haqqında təşviqat aparmaq; **2**. əldə etmək, nail / müvəffəq olmaq; can atmaq, əldə etməyə çalışmaq; **3**. ətraflı şəkildə təhlil etmək; **to ~ a subject** məsələni hərtərəfli təhlil etmək; **4**. *amer.* səsləri rəsmi şəkildə/rəsmi olaraq hesablamaq; **5**. sorğu yolu ilə, tərəfdarların miqdarını müəyyənləşdirmək *(namizədlərin, qanun layihəsinin və s.)*; **to ~ public opinion** ictimai rəyi müəyyənləşdirmək üçün sorğu aparmaq
**canvasser** ['kænvəsəʳ] *n* **1**. *namizəd və ya onun xeyrinə səs toplamaq üçün ev-ev gəzib səs toplayan tərəfdar*; **2**. sığorta cəmiyyətinin nümayəndəsi, firmanın müvəkkili; **3**. *sorğu vasitəsi ilə qanun layihəsi və s. barədə rəy sorğusu keçirən şəxs;* **4**. *amer. seçkilərin nəticələrinin doğruluğunu yoxlayan komissiyanın üzvü*
**cany** ['keını] *adj* qamış, qamışdan qayrılmış, qarğı, qarğıdan qayrılmış
**canyon** ['kænjən] *n* kanyon *(sıldırımlı dərin dar dərə)*
**canzona** [kæn'tsounə] *n (pl* **-ne***) mus.* kansona *(musiqinin müşayiəti ilə bir səslə oxunan milli koloritli vokal pyes)*
**caoutchouc**$^{1}$ ['kautʃuk] *n* **1**. kauçuk, rezin; **2**. süni rezin
**caoutchouc**$^{2}$ ['kautʃuk] *adj* kauçuk, ~ **tree** kauçuk ağacı
**cap**$^{1}$ [kæp] *n* I **1**. papaq, şapka; baş örtüyü; **fur ~** xəz papaq; **college / square ~** üstü kvadrat şəkilli baş örtüyü *(ingilis tələbələrinin və ya professorlarının geyindiyi papaq)*; **2**. kepka, furajka; **jockey ~** jokey furajkası / papağı; **3**. *hərb.* pilotka, pilot papağı; **4**. beret; **5**. qalpaq, papaq *(həkimlərin, aşpazların və s. geydiyi)*; **6**. ləçək

*(evdə geyilən);* 7. örtük; ~ **of snow** qar örtüyü; **cloud** ~ bulud örtüyü; **eyepiece** ~ fotoaparatın obyektivinin örtüyü; 8. çexol, örtü, üz; futlyar; 9. piston, kapsul *(güllədə, bombada);* 10. iri formatlı yazı kağızı; 11. beynəlxalq yarışlarda ölkəsini təmsil edən idmançı *(milli gerb olan papaq geyən);* **to win** *one's* ~ beynəlxalq yarışlarda öz ölkəsini təmsil etmək hüququ qazanmaq;
◊ ~ **and gown** 1) ingilis professorlarının və tələbələrinin forması *(paltarı);* 2) tələbə; ~ **and bells** təlxək papağı *(zınqırovlu);* **to wear** ~ **and bells** təlxəklik etmək; **to send the** ~ **round** papaq açıb pul yığmaq; **to touch** *one's* ~ **to** *smb.* papağını çıxarıb bir kəsə rəsmi təzim etmək; **to put on** *one's* **thinking** ~ papağını qarşısına qoyub fikirləşmək; **to put on the black** ~ ölüm hökmü çıxartmaq; **to pull** ~**s** *arx.* saçlaşmaq, bir-birinin saçından yapışmaq *(qadınlar haq.)*

**cap²** [kæp] *adj* = **capital** *sözünün qısaldılmış forması;* ~ **letter** böyük/baş hərf

**cap³** [kæp] *v* (-pp-) 1. papaq/kepka geymək, başını örtmək; 2. çexolla/ləçəklə örtmək; 3. örtmək; *Snow caps the mountains Qar dağların başını örtür;* 4. *hörmət əlaməti olaraq bir kəsin qarşısında papağını çıxartmaq / götürmək; I cap to that Mən bununla razıyam;* 5.: **to be ~ped for** beynəlxalq yarışlarda təmsil etmək; *He was capped for England O, yarışlarda İngiltərəni təmsil etdi;*
◊ **to** ~ **an anecdote/a proverb** lətifəyə /atalar sözünə lətifə ilə/atalar sözü ilə cavab vermək *(oyunda, yarışda); This caps it all! Elə bircə bu çatmırdı! / qalmışdı!*

**capabilities** [ˌkeɪpəˈbɪlɪtɪz] *n* inkişaf etmiş qabiliyyətlər, potensial imkan; *She has capabilities as a singer; she is worth training Onun müğənnilik qabiliyyəti var; onunla məşq etməyə dəyər*

**capability** [ˌkeɪpəˈbɪlɪtɪ] *n* qabiliyyət, istedad, bacarıq; *We compared the capabilities of the 2 boys and found the first to be much cleverer Biz bu iki oğlanın qabiliyyətlərini müqayisə etdik və məlum oldu ki, birincisi daha ağıllıdır*

**capable** [ˈkeɪpəbl] *adj* 1. qabiliyyətli, istedadlı, zehinli, bacarıqlı; **a very** ~ **doctor** çox bacarıqlı/qabiliyyətli həkim; *My son's capable as a driver Mənim oğlum sürücü kimi bacarıqlıdır;* 2. qadir, əlindən gələn, bilən; *She's capable of any crime O hər cür cinayət etməyə qadirdir, Onun əlindən hər cür cinayət etmək gələr;* ~ **of every wickedness** hər cür alçaqlıq etməyə qadir; ~ **of bringing happiness** xoşbəxtlik gətirə bilən; 3. (of) *hüq. arx.* ixtiyarı/hüquqi olan; **to be** ~ **of** *smth.* bir şeyə qadir / malik olmaq

**capably** [ˈkeɪpəblɪ] *adv* bacarıqla, məharətlə, ustalıqla

**capacious** [kəˈpeɪʃəs] *adj* tutumlu, həcmli, geniş, çoxtutan, gen-bol, çox şey tutan; ~ **pocket** tutumlu/geniş/çox şey tutan cib; **a** ~ **bottle** həcmli/tutumlu butulka; ~ **mind** geniş / dərin ağıl

**capaciously** [kəˈpeɪʃəslɪ] *adv* həcmli, gen-bol, geniş

**capaciousness** [kəˈpeɪʃəsnɪs] *n* tutumluluq, genişlik, həcmlilik

**capacity** [kəˈpæsɪtɪ] *n* 1. tutum, həcm; *The seating capacity of this theatre is 500 Bu teatr 500 adam tutur; This is a building of very large capacity Bu çox həcmli binadır, Bu bina çox adam tutur;* ~ **of vehicle** nəqliyyatın yükgötürmə/adamdaşıma tutumu; **carrying** ~ daşıma tutumu *(avtobusun, tramvayın və s.);* ~ **of highway** yolun xidmət etmə qabiliyyəti; ~ **to pay** ödəmə qabiliyyəti; **a** ~ **for work** işləmək /iş qabiliyyəti, çalışmaq iqtidarı, iş bacarığı; 2. əqli qabiliyyət; **a person of** ~ əqilli / bacarıqlı adam; **a mind of great** ~ dərin ağıl; 3. kompetensiya, səriştə, bilik, təcrübə; səlahiyyət; 4. vəzifə, qulluq; **in the** ~ **of an engineer** mühəndis vəzifəsində; **in the** ~ **of a friend** dost kimi; 5. *hüq.* hüquqa malik olma; səlahiyyətli, hüquq səlahiyyəti olan; **contractual** ~ müqavilə bağlama hüququ; ~ **to marry** evlənmə hüququna malik olma; 6. *tex.* güc, qüvvə, qüdrət; məhsuldarlıq, səmərəlilik; **to work at/to** ~ tam gücü ilə işləmək

**cap-a-pie** [ˌkæpəˈpiː] *adv fr.* başdan ayağa kimi; *He was armed cap-a-pie O, başdan ayağa kimi silahlanmışdı*

**caparison¹** [kəˈpærɪsən] *n* 1. yəhəraltı, çul; at üçün ləvazimat; 2. geyim, paltar, libas

**caparison²** [kəˈpærɪsən] *v* 1. çullamaq, yəhərləmək *(atı);* 2. bəzəmək; geyinmək, geyindirmək, geyindirib-kecindirmək

**cape** [keɪp] *n* I 1. plaş, yağmurluq; çiyinlik, bürüncək; *A cape gives a man good protection in wet weather Plaş adamı nəmli havada yaxşı qoruyur;* 2. pelerin *(çiyin örtüyü),* başlıqlı plaş; 3. başlıq *(paltarın yaxasına tikili başlıq);*
◊ ~ **and dagger fiction / novel** casus romanı, macəra ədəbiyyatı

**cape** [keɪp] *n* II *coğr.* burun; **the Cape of Good Hope** Ümid burnu

**caped** [keɪpt] *adj* 1. plaş geymiş; 2. başlıqlı; ~ **jacket** başlıqlı kurtka / gödəkcə

**capelet** [ˈkæpəlet] *n* döyənək *(atın bədənində)*

**capellet** [ˈkæpəlet] *n* = **capelet**

**caper¹** [ˈkeɪpəʳ] *n* I 1. atılma, hoppanma, tullanma, sıçrama; sıçrayış, atlanma; 2. nadinclik, şitlik, şuluqluq; gic hərəkət, səfehlik; **to cut** ~**s** / **a** ~ 1) atılmaq, hoppanmaq, sıçramaq; 2) gicgic zarafat etmək, şitlik etmək

**caper** [ˈkeɪpəʳ] *n* II *tar.* kaper *(dəniz quldurluğu ilə məşğul olan gəmi yaxud bu cür gəmi sahibi)*

**caper²** [ˈkeɪpəʳ] *v* 1. atılmaq, hoppanmaq, sıçramaq, atılıb-düşmək; *The lambs were capering in the field Quzular çöldə atılıb-düşürdülər;* 2. gic-gic zarafat etmək, şitlik etmək

**capercailye** [ˌkæpəˈkeɪljɪ] *n zool.* Sibir xoruzu

**capercailzie** [ˌkæpəˈkeɪlzɪ] *n* = **capercailye**

**capful** [ˈkæpful] *n* bir papaq, papaq dolusu



**capias** [ˈkeɪpɪæs] *n hüq.* həbs haqqında order

**capital** [ˈkæpɪtl] *n* I 1. paytaxt; baş/əsas şəhər; *Paris is one of the world's beautiful capitals Paris dünyanın gözəl paytaxtlarından biridir;* 2. böyük/baş hərf; 3. əsas, ən vacib; ~ **point** əsas / ən vacib məsələ; ~ **error** əsas səhv; ~ **amount** əsas məbləğ; 4. əsaslı; ~ **repairs** əsaslı təmir; ~ **construction** əsaslı tikinti; 5. ölüm cəzasına layiq; ~ **crime** ölüm cəzasına layiq cinayət; ~ **punishment** ölüm cəzası; ~ **sentence** ölüm hökmü; 6. *d.d.* əla, çox gözəl/yaxşı; ~ **idea** əla fikir; ~ **fellow** çox gözəl / yaxşı oğlan;
◊ ~ **ship** iri hərbi gəmi

**capital** [ˈkæpɪtl] *n* II 1. *siya. iq.* kapital; **circulating/floating/working** ~ dövriyyə kapitalı; **fixed / constant** ~ sabit kapital; **variable** ~ dəyişən kapital; 2. *mal.* əsas kapital; 3. *mal.* auksioner kapitalı; ~ **of a company** kompaniyanın auksioner kapitalı; 4. əsas məbləğ; ~ **and interest** əsas məbləğ və faiz; 5. kapital, kapitalist, kapitalistlər sinfi; **labour and** ~ əmək və kapital; 6. mənfəət, üstünlük; **to make** ~ **by/out of** *smth.* bir şeydən mənfəət əldə etmək / götürmək

**capitalism** [ˈkæpɪtəlɪzm] *n* kapitalizm

**capitalist¹** [ˈkæpɪtəlɪst] *n* kapitalist; kapitalizm tərəfdarı

**capitalist²** [ˈkæpɪtəlɪst] *adj* kapitalist; ~ **class** kapitalist sinfi; **the** ~ **countries of the West** Qərbin kapitalist ölkələri

**capitalistic** [ˈkæpɪtəˈlɪstɪk] *adj* = **capitalist²**

**capitalization, -isation** [kəˌpɪtəlaɪˈzeɪʃn] *n* 1. kapitallaşdırma, kapitallaşma *(izafi dəyərin kapitala çevrilməsi);* 2. baş hərfin yazıda işlənməsi

**capitalize, -ise** [ˈkæpɪtəlaɪz] *v* 1. kapitallaşdırmaq; 2. (on) kapital qazanmaq, mənfəət əldə etmək; 3. baş hərflə yazmaq

**capitally** [ˈkæpɪtlɪ] *adv* 1. ciddi, ciddi olaraq, ciddiliklə; 2. əla, çox gözəl/yaxşı; 3. *hüq.* **to accuse** ~ ölüm cəzasına bərabər cəza vermək; **to punish** ~ edam etmək

**Capitol** [ˈkæpɪtl] *n* Kapitolya; ştatların qanunvericilik məclisinin binası

**capitulate** [kəˈpɪtjuleɪt] *v* 1. təslim olmaq; məcburi güzəştə getmək; *He finally capitulated and allowed his daughter to go to the movie Nəhayət o, güzəştə getdi və qızına kinoya getməyə razılıq verdi;* **to** ~ **to overwhelming numbers** üstün olan güc qarşısında təslim olmaq; 2. (**with**) *arx.* danışıq aparmaq, razılaşmaq, müqavilə bağlamaq, razılığa gəlmək

**capitulation** [kəˌpɪtjuˈleɪʃn] *n* təslim olma; istəmədən güzəştə getmə

**capon¹** [ˈkeɪpən] *n* 1. axta xoruz; 2. qorxaq, ağciyər; cəsarətsiz *(adam),* arvadxasiyyət kişi; 3. sevgi məktubu

**capon²** [ˈkeɪpən] *v k.t.* axtalamaq *(xoruzu)*

**caponize, -ise** [ˈkeɪpənaɪz] *v k.t.* axtalamaq *(quşları)*

**capricci** [kəˈprɪtʃɪ] *n* **capriccio** *sözünün cəmi*

**capriccio** [kəˈprɪtʃɪou] *n* *(pl* **-cci***)* 1. kapriççio *(sərbəst və oynaq xarakterli musiqi əsəri);* 2. şıltaq hərəkət/davranış; 3. yalan-palan, uydurma; 4. şıltaq, şıltaqlıq, şıltaqçılıq, tərslik

**caprice** [kəˈpriːs] *n* 1. şıltaqlıq, ədabazlıq; 2. qərarsızlıq; səbatsızlıq; dəyişkənlik; orijinallıq, özünəməxsusluq

**capricious** [kəˈprɪʃəs] *adj* 1. şıltaqçı, şıltaq; dəyişkən, qərarsız, özünəməxsus, orijinal; 2. *arx.* qəribə, əcaib, ədabaz

**capriciously** [kəˈprɪʃəslɪ] *adv* 1. sırtıqcasına, sırtıq, dəyişkən bir tərzdə, özünəməxsus bir halda; 2. ədabazlıqla, qəribə bir halda / tərzdə

**capriciousness** [kəˈprɪʃəsnɪs] *n* 1. sırtıqlıq, dəyişkənlik, qərarsızlıq; 2. orijinallıq, ədabazlıq, əcaiblik

**Capricon** [ˈkæprɪkɔːn] *n* Oğlaq bürcü; **tropic** ~ Oğlaq tropiki

**caprine** [ˈkæpraɪn] *adj* keçi

**capsicum** [ˈkæpsɪkəm] *n bot.* qırmızı bibər

**capsize¹** [kæpˈsaɪz] *n* çevirmə, çevrilmə, aşma *(qayıq haq.)*

**capsize²** [kæpˈsaɪz] *v* çevirmək; çevrilmək, aşmaq *(gəmi, qayıq və s.); The large wave capsized the boat Böyük dalğa qayığı aşırdı / çevirdi*

**capstan** [ˈkæpstən] *n tex.* 1. kabestan, dolamaçarx *(yükü dartıb çəkmək üçün mexanizm);* 2. boltun başı

**capsule¹** [ˈkæpsjuːl] *n* 1. qabıq; kapsul *(piston: güllədə, bombada);* 2. *bot.* toxum qozası; 3. qapaq, başlıq *(butulkada və s.);* 4. *tex.* membran, pərdə; 5. xülasə, nəticə *(məqalənin, nitqin və s.)*

**capsule²** [kæpsjuːl] *adj amer.* qısa, yığcam; ~ **explanation** qısa/yığcam izahat; ~ **biography** qısa tərcümeyi-hal

**captain¹** [ˈkæptɪn] *n* 1. kapitan; **the** ~ **of the team** komandanın kapitanı; 2. rəis, başçı, müdir; **Captain of the guard** qarovul rəisi *(İngiltərədə);* 3. starşina, komandir; zabit; növbətçi; ~ **of the day** hissə üzrə günün növbətçisi

**captain²** [ˈkæptɪn] *v* 1. rəhbərlik etmək, aparmaq; 2. başçılıq etmək *(komandaya və s.);* 3. kapitan olmaq *(gəmidə)*

**captainship** [ˈkæptɪnʃɪp] *n* 1. kapitan rütbəsi / vəzifəsi; 2. sərkərdəlik məharəti / bacarığı

**captation** [kæpˈteɪʃn] *n* yaltaqlıq, tülkülük, yaltaqlanma, yaltaqlıq etmə, qılığa girmə; təngə gətirmə, əldə etməyə çalışma

**caption** [ˈkæpʃn] *n* 1. *amer.* başlıq, sərlövhə, ad *(məqalə və s.);* 2. titr *(kino şəkillərində məzmuna aid yazı);* 3. *hüq.* məhkəmənin qərarına əsasən həbs etmək *(bir kəsi);* **letters of** ~ həbs haqqında order

**captious** [ˈkæpʃəs] *adj* 1. bəhanə axtaran, bəhanəçi, hər şeyə irad tutan; ~ **criticism** xırdaçı tənqid, yersiz irad/tənqid, tənqidbazlıq; 2. çaşdırıcı, dolaşdırıcı; aldadıcı; saxta, yalançı, ikimənalı; ~ **question** çaşdırıcı / dolaşdırıcı sual

**captivate** ['kæptıveıt] *v* **1.** əsir etmək/almaq; **2.** *məc.* məftun/valeh/cəzb/bənd/ heyran etmək; *The girl's beauty captivated him Qızın gözəlliyi onu məftun/valeh / heyran etdi*
**captivating** ['kæptıveıtıŋ] *adj* heyranedici, cazibədar, füsunkar; çox gözəl, çox qəşəng, könülalan, könülovlayan, məftunedici, valehedici, füsunkar, cazibəli; **~ smile** füsunkar / cazibədar / məftunedici təbəssüm
**captivation** [.kæptı'veıʃn] *n* **1.** cazibə, cazibədarlıq, füsunkarlıq, lətafət, məlahət; **2.** *arx.* əsir etmə / edilmə; əsirlik
**captive**[1] ['kæptıv] *n* **1.** əsir; **to be taken ~ 1)** əsir alınmaq / götürülmək, əsir olmaq; **2)** məftun / valeh / vurğun olmaq
**captive**[2] ['kæptıv] *adj* **1.** əsir, əsir alınmış / götürülmüş, əsir düşmüş; **to hold ~** əsir saxlamaq; **2.** azadlıqdan məhrum edilmiş; əsarət altına alınmış, məhkum edilmiş; **~ nations** azadlıqdan məhrum edilmiş xalqlar; **3.** əsir/məftun/cəzb edilmiş, məftun
**captivity** [kæp'tıvıtı] *n* **1.** əsirlik, əsarət; **to be in ~** əsirlikdə olmaq; **2.** əsarət altına salma/alma; əsarət, qulluq, köləlik; *Some birds will not sing in captivity Bəzi quşlar qəfəsdə oxumur*
**capture**[1] ['kæptʃə<sup></sup>] *n* **1.** əsir alma/götürmə; tutma, yaxalama; ələ keçirmə *(cinayətkarı)*; **2.** zəbt/istila/işğal etmə; **3.** *hərb.* qənimət
**capture**[2] ['kæptʃər] *v* **1.** əsir almaq / götürmək; **to ~ 1,000 of the enemy** düşmənin 1000 nəfərini əsir almaq / götürmək; **2.** tutmaq, ələ keçirmək; *The cat has captured a mouse Pişik bir siçan tutub;* **3.** zəbt /istila/işğal etmək, tutmaq; **to ~ a city** şəhəri zəbt/istila/ işğal etmək; **4.** qazanmaq *(priz və s.)*; **5.** cəzb/cəlb/məftun/valeh etmək; **to ~ all hearts** bütün qəlbləri/ürəkləri məftun etmək; *This advertisement will capture attention Bu reklam diqqəti cəlb edəcək*
**captured** ['kæptʃəd] *adj* **1.** zəbt/istila/işğal / qəsb edilmiş; tutulmuş; ələ keçirilmiş; **2.** qənimət, qənimət olaraq alınmış/ələ keçirilmiş; **~ documents/equipment** qənimət olaraq ələ keçirilmiş sənədlər / ləvazimat; **3.** cəzb/cəlb edilmiş; **4.** heyran /valeh /məftun olmuş, vurulmuş
**car**[1] [ka:r] *n* **1.** maşın *(minik)*, (avto)maşın; **to come by ~** maşınla gəlmək; **to get into the ~** maşına minmək; **to get out of the car** maşından düşmək; **goods ~** yük maşını; **2.** *amer.* vaqon; **the ~s** qatar; **coach ~** sərnişin vaqonu; **goods / freight ~** yük vaqonu; **sleeping ~** yataqlı vaqon; **smoking ~** papiros çəkənlər üçün vaqon; **dining ~** vaqon-restoran
**car**[2] [ka:] *adj* maşın; **~ driver** maşın sürən, şofer; **~ lift** maşın lifti *(təmir etmək üçün maşını qaldıran dəzgah)*; **~ operation** maşın istisməri; **~ park** qaraj; **~ crew** maşın ekipajı
**carabine** ['kærəbın] *n* = **carbine**
**carabineer** [.kærəbı'nıər] *n* *hərb. tar.* karabiner *(karabinlə silahlanmış əsgər)*
**caracal** ['kærəkæl] *n zool.* karakal *(səhra vaşağı)*
**caracul**[1] ['kærəkəl] *n* **1.** qaragül *(qıvrım yunlu quzu dərisi, Buxara dərisi)*; **2.** qaragül qoyunu
**caracul**[2] ['kærəkəl] *adj* qaragül, Buxara; **~ coat** qaragül dərisindən palto; **~ sheep** qaragül qoyunu
**carafe** [kə'ra:f] *n* qrafin
**caramel** ['kærəmel] *n* **1.** karamel *(konfet növü)*; **2.** yandırılmış qənd / şəkər
**carat** ['kærət] *n* karat *(qiymətli daşların 200-206 mq-a bərabər çəki ölçüsü)*
**caravan** [.kærə'væn] *n* **1.** karvan; **2.** qatar, sıra, düzüm *(quş, bulud və s.)*; **3.** furqon, örtülü qaraçı arabası; **4.** yaşamaq üçün qaydaya salınmış qoşma vaqon
**caravaneer** [.kærəvə'nıər] *n* sarvan, karvan başçısı; karvan başçısı
**caraway**[1] ['kærəweı] *n bot.* zirə
**caraway**[2] ['kærəweı] *adj* zirə; **~ oil** zirə yağı; **~ seed** zirə toxumu; *This nice bread has got caraway seeds in it Bu qəşəng çörəyə zirə vurulmuşdur*
**carbamide** ['ka:bəmaıd] *n kim.* sidik cövhəri
**carbide** ['ka:baıd] *n kim.* karbid
**carbine** ['ka:baın] *n hərb.* karabin *(gödək lüləli tüfəng)*
**carbineer** [.ka:bı'nıər] *n* = **carabineer**
**carbo** ['ka:bou] *n əcz.* ağac kömürü
**carbohydrate** ['ka:bou'haıdreıt] *n kim.* karbohidrat
**carbolic** [ka:'bɔlık] *adj* karbol; **~ acid** karbol turşusu
**carbon** ['ka:bən] *n kim.* **1.** karbon; **2.** kömür, kimyəvi baxımdan təmiz kömür; **3.** qrafit; **4.** texniki almaz; **5.** kopirka *(surət çıxaran kağız)*; *Make several carbons Bir neçə nüsxədə çap et / edin*
**carbonated** ['ka:bəneıtıd] *adj* karbon qazı ilə doydurulmuş; **~ water** qazlı su
**carbonation** [.ka:bə'neıʃn] *n* karbon qazı vurma, karbonlaşdırma, karbonlaşdırılma
**carbonic** [ka:'bɔnık] *adj* kömür; karbonlu, karbon
**carbonify** [ka:'bɔnıfaı] *v* = **carbonize**
**carbonization, -isation** [.ka:bənaı'zeıʃn] *n* **1.** kokslaşma, kokslaşdırma; **2.** kömürə döndərmə, kömürə dönmə
**carbonize, -ise** ['ka:bənaız] *v* **1.** kokslaşdırmaq; kömürü koksa çevirmək; **2.** yandırıb kömürə döndərmək, kömürləşdirilmək
**carbon-paper** ['ka:bən.peıpər] *n* kopiya kağızı
**carcass** ['ka:kəs] *n* **1.** cəmdək *(heyvanın)*; **the ~ of a lion** şir cəmdəyi; **2.** meyit, nəş, cəsəd *(insan haq.)*; **3.** can; **to save *one's* ~** canını xilas etmək/qurtarmaq; **to pamper *one's* own ~** özünü əzizləmək, öz qeydinə qalmaq, özünə xidmət/qulluq etmək, **4.** *tik.* armatura *(dəmir-beton qurğularda metal çərçivə)*
**card**[1] [ka:d] *n* I karda *(yun, kətan, pambıq və s. daramaq üçün şotka)*
**card** [ka:d] *n* II **1.** qumar kağızı/kartı; **trump ~** kozır *(kart oyununda baş xal)*; **pack of ~s** bir



dost oyun kartı/qumar kağızı; **to play/to lead a ~** hər hansı bir kartla getmək; **to cut ~s** qumar kağızını / kartını kəsmək; **to play *one's* ~s well 1)** yaxşı oynamaq; **2)** imkandan istifadə etmək; **to play *one's* ~s badly 1)** pis oynamaq; **2)** imkandan istifadə etməmək, imkanı əldən vermək/qaçırmaq; **2.** kartoçka; **calling/visiting ~** vizit kartoçkası; **to leave a ~ upon *smb.*** bir kəs üçün vizit kartoçkası qoymaq; **postal ~** *amer.* poçt kartoçkası, açıq məktub; **wedding ~** toy dəvətnaməsi; **birthday ~** təbrik kartoçkası *(ad günü münasibətilə)*; **library ~** abonement kartoçkası; **3.** bilet; dəvət; **invitation ~** dəvətnamə; **a membership ~** üzvlük bileti;
◊ ***one's* best ~** əsas kozır, ən əsas sübut; **a house of ~s** oyuncaq ev; **to play a wrong ~** yanlış addım atmaq; **to count on *one's* ~s** bəxtə bel bağlamaq/ümid etmək; **to throw/to fling up *one's* ~s 1)** öz fikrindən əl götürmək / imtina etmək; **2)** oyundan çıxmaq; təslim olmaq, mübarizədən əl çəkmək / götürmək
**card**[2] [ka:d] *v* I *toxuc.* daramaq *(yunu, pambığı və s.)*
**card** [ka:d] *v amer.* II **1.** yarlıq yapışdırmaq; **2.** nümunə və s. yapışdırmaq
**cardamom** ['ka:dəməm] *n* hil *(ədviyyə)*
**cardamon** ['ka:dəmən] *n* = **cardamom**
**cardamum** ['ka:dəməm] *n* = **cardamom**
**cardon-joint** ['ka:dən'dʒɔınt] *n tex.* kardan
**cardboard**[1] ['ka:dbɔ:d] *n* karton *(qalın və bərk kağız)*
**cardboard**[2] ['ka:dbɔ:d] *adj* karton; kartondan düzəldilmiş; **~ binding** karton cildləmə; **~ cover** karton /bərk cild *(kitab və s. haq.)*; **~ scissors** karton kəsmək üçün qayçı
**card-case** ['ka:dkeıs] *n* qab, vizit kartoçkası üçün qutu
**card-catalogue** ['ka:d'kætəlɔg] *n* kartoçka kataloqu; kartoteka
**carder** ['ka:dər] *n toxuc.* **1.** darayıcı, darayan fəhlə; xovlayıcı, xovverən *(fəhlə)*; **2.** darama maşını
**cardiac**[1] ['ka:dıæk] *n tib.* **1.** ürək fəaliyyətini artıran dava-dərman; **2.** *d.d.* ürək xəstəliyi olan adam
**cardiac**[2] ['ka:dıæk] *adj anat.* ürək, ürəyə aid olan; **~ valve** ürək qapağı; **~ disease** ürək xəstəliyi; **~ defect** ürək qüsuru; **~ dilatation** ürək genişlənməsi
**cardinal**[1] ['ka:dınl] *n* **1.** kardinal *(Roma katolik kilsəsində baş ruhani rütbəsi)*; **2.** al-qırmızı rəng
**cardinal**[2] ['ka:dınl] *adj* **1.** əsas; başlıca; baş, vacib; ən mühüm; **~ arguments** əsas dəlil/sübut; **~ events** əsas/başlıca hadisə; **~ problem** başlıca/əsas problem; **a matter of ~ importance** başlıca/əsas əhəmiyyət kəsb edən məsələ; **2.** al-qırmızı
**cardinally** ['ka:dınəlı] *adv* qəti/köklü surətdə
**carding** ['ka:dıŋ] *n toxuc.* darama
**cardiology** [.ka:dı'ɔlədʒı] *n* kardiologiya *(tibb elminin ürək xəstəlikləri bəhsi)*
**cardiopathy** [.ka:dı'ɔpəθı] *n tib.* ürək xəstəliyi
**cardiovascular** ['ka:dıə'væskjulə] *adj anat.* ürək-damar; **~ system** ürək-damar sistemi
**care**[1] [keər] *n* **1.** qayğı, qeyd; kömək, baxım, himayə; **free from ~** qayğısız; **under the doctor's ~** həkimin qayğısı altında, həkimin himayəsində; **~ of public health** ictimai səhiyyə qayğısı; **in ~ of *smb.*** bir kəsin himayəsində; *The baby was left in Mary's care Uşaq Merinin himayəsində qaldı; I will leave this to your care Bunu mən sənin / sizin himayənə / himayənizə buraxıram; The library is under the care of Mr. Green Kitabxana cənab Qrinin himayəsindədir;* **to take ~ of *smb.*** bir kəsin qayğısına/qeydinə qalmaq; **to take ~ of veterans** veteranların qeydinə/qayğısına qalmaq; **2.** diqqətlilik; ehtiyatlılıq; *You should give more care to your work Sən / Siz işində / işinizdə daha çox diqqətli olmalısan/olmalısınız; Glass: Handle with care! Şüşədir, diqqətli olun! Take care! Ehtiyatlı olun!* **to have a ~** bir az diqqətli/ehtiyatlı olmaq; *"Have a care, sir!" said the old man when I stood on his toe Mən onun ayaq barmağını çığnayanda qoca kişi dedi: "Bir az diqqətli ol/olun, cənab!"; Don't worry, I'll take care of the child Narahat olmayın, mən uşağın qeydinə qalacağam; Take care of the baby while I'm out Mən evdə olmayanda uşağın qeydinə qal/qalın;* **3.** *jarq.* əzişdirmək, döymək, öldürmək; *If you don't give me the money, I'll send my boys to take care of you Əgər pulumu verməsən / verməsəniz, oğlanlarımı göndərəcəm səni əzişdirsinlər;* **4.** dərd, kədər, qayğı; *Her face was worn with care Onun sifəti dərddən / qayğıdan üzgün hala düşmüşdü; He hasn't a care in the world Onun dünyada heç bir dərdi yoxdur;* **the ~s of the day** günün qayğıları
**care**[2] [keər] *v* **1. (for, of, about)** qayğısına / qeydinə / dərdinə qalmaq, fikrini çəkmək *(bir kəsin, bir şeyin)*; **to ~ about *smb.* / *smth.*** bir kəsin/şeyin qeydinə / qayğısına qalmaq; *The children are well cared for Uşaqların qeydinə yaxşı qalırlar;* **2.** narahat olmaq, həyəcan keçirmək, əsəbiləşmək; rahatsız olmaq, iztirab çəkmək; *He failed at the examination, but I don't think he cares very much O, imtahandan kəsilib, məncə, bu, onun çox da vecinə deyil; I don't care what people say Camaatın nə danışmağı məni heç narahat etmir; You don't seem to care much Görünür bu səni / sizi heç narahat etmir;* **3.** istəmək, həvəsi olmaq; *I don't care to be seen here Mən heç istəmirəm ki, məni burada görsünlər; Would you care to read this book? Sən / Siz bu kitabı oxumaq istəyirsənmi / istəyirsinizmi? Would you care to go for a walk? Sən / Siz gəzməyə getmək istəyirsənmi/ istəyirsinizmi?;* **to ~ for** maraqlanmaq, maraq göstərmək; sevmək, həvəs göstərmək; **to ~ for music** musiqini sevmək, musiqiyə maraq göstərmək; *I*

*don't care for gardening Mən bağçılığa meyl / maraq göstərmirəm ; I don't care for that moving-picture Bu kinofilm mənim xoşuma gəlmir*; **to ~ for riches** var-dövlət toplamağa can atmaq; ◊ **not to ~ a fig** qətiyyən fikir verməmək; *I don't care a fig Mənim heç vecimə deyil; For all I care..., For what I care.. Mənə qaldıqda.., Mənə gəldikdə...*

**career¹** [kə'rɪə^r] *n* 1. cəld hərəkət; 2. mənsəb, karyera; nailiyyət, müvəffəqiyyət; **to make a ~ for oneself** özünə karyera qazanmaq, mənsəbə çatmaq; *He has a brilliant career before him Onun parlaq gələcəyi var*; 3. həyat yolu; **~ of great men** məşhur/böyük adamların həyat yolu; 4. sənət, peşə; iş; məşğuliyyət; **~s open to women** qadınların görə biləcəyi işlər / məşğuliyyətlər; *She had the choice between a home and a career O, ailə və iş arasında seçim qarşısında qalmışdı*; **to follow diplomacy as a ~** özünə diplomat peşəsini seçmək

**career²** [kə'rɪə^r] *adj* peşəkar, professional; **~ diplomat /diplomatist** peşəkar/professional diplomat; **~ woman** *amer.* işləyən qadın, ixtisası olan qadın

**career³** [kə'rɪə^r] *v* 1. sürətlə/çaparaq getmək, yüyürmək; qaçmaq; dördnala çapmaq; 2. çaparaq sürmək *(atı və s.)*

**careerism** [kə'rɪərɪzm] *n* vəzifəpərəstlik, mənsəbpərəstlik

**careerist** [kə'rɪərɪst] *n* vəzifəpərəst, mənsəbpərəst, karyerist

**carefree** ['keəfri:] *adj* qayğısız, qəmsiz, dərdsiz, fikirsiz, laqeyd; **to be ~** qayğısız / qəmsiz olmaq; *On a fine spring day like this I feel quite carefree Belə gözəl bir yaz günündə mən özümü tam qayğısız hiss edirəm*

**careful** ['keəfl] *adj* 1. qayğıkeş, qeydəqalan, qayğıçəkən; **~ mother** qayğıkeş ana; **to be ~ of one's health** sağlamlığının qeydinə qalmaq; 2. çalışqan, səyli; canyandıran; **a ~ worker** çalışqan fəhlə; 3. diqqətli; ehtiyatlı; *If you'd been more careful crossing the road, you wouldn't have been hit by the car Əgər sən / siz yolu keçərkən bir az ehtiyatlı olsaydın/olsaydınız, səni / sizi maşın vurmazdı; Do be careful with that knife! d.d. O bıçaqla çox ehtiyatlı ol/olun ha! Be careful not to break it Ehtiyatlı ol ki,/olun ki, onu sındırmayasan/sındırmayasınız;* 4. dəqiq *(hesab və s.)*, səliqəli; 5. *d.d.* bir az xəsis/ simic; qənaətçi, qənaətcil; **a ~ housewife** qənaətcil evdar qadın

**carefully** ['keəfəlɪ] *adv* 1. ehtiyatla, ehmalla, üsulla; **to handle ~** ehtiyatla davranmaq, ehtiyatlı/ehmallı olmaq; 2. diqqətlə, səliqə ilə; **to listen/to read/to translate ~** diqqətlə dinləmək / oxumaq / tərcümə etmək

**carefulness** ['keəfəlnɪs] *n* 1. qayğı, qayğıkeşlik, qeydə qalma; 2. diqqətlilik, dəqiqlik; səy, cəhd, cidd-cəhd, çalışqanlıq; 3. ehtiyatlılıq, ehtiyat, ehtiyatkarlıq; 4. dəqiqlik, dürüstlük

**careless** ['keələs] *adj* 1. səliqəsiz, diqqətsiz, etinasız, huşsuz; **a ~ piece of work** səliqəsiz görülmüş iş; **a ~ driver** diqqətsiz sürücü; *A careless driver is a danger to us all Diqqətsiz sürücü bizim hamımız üçün təhlükədir*; **~ mistake** etinasızlıq/huşsuzluq üzündən edilmiş səhv; 2. səliqəsiz, səhlənkar, düz olmayan; 3. qeydsiz, qayğısız, dərdsiz; qəmsiz, fikirsiz

**carelessly** ['keələslɪ] *adv* 1. səliqəsiz, diqqətsiz, başdansovma, saymazyana; 2. dərdsiz, dərdsizqəmsiz, qüssəsiz; laqeyd; 3. qəfildən, qəflətən, bilmədən, bilməyərək

**carelessness** ['keələsnɪs] *n* 1. səliqəsizlik, diqqətsizlik, huşsuzluq; etinasızlıq, saymamazlıq; 2. səliqəsizlik; yanlışlıq; 3. başısoyuqluq, qayğısızlıq, qəmsizlik, laqeydlik

**caress¹** [kə'res] *n* 1. nəvaziş, oxşama, nazlama; iltifat, mehribanlıq; **to respond to the ~** nəvazişə cavab vermək; **to shower ~es upon *smb.*** bir kəsə həddən artıq nəvaziş göstərmək, bir kəsi həddən artıq nazlamaq/oxşamaq; 2. yüngülcə toxunma və ya öpüş

**caress²** [kə'res] *v* oxşamaq, əzizləmək, nazlamaq, nəvaziş göstərmək; mərhəmət etmək; tumarlamaq, sığallamaq, oxşamaq; **to ~ *one's* child** uşağını oxşamaq/əzizləmək/nazlamaq; *He caressed his wife lovingly O, arvadını məhəbbətlə oxşadı; She caressed her child O, uşağını oxşadı; She caressed the boy's cheek O, uşağın yanağını sığalladı*; **to ~ the ear** qulağı oxşamaq *(səs haq.)*

**caressing** [kə'resɪŋ] *adj* mehriban, nəvazişli, nəvazişkar, incəqəlbli, şəfqətli

**caressingly** [kə'resɪŋlɪ] *adv* sevgilə, şəfqətlə, nəvazişlə, sevə-sevə, nəvazişkar bir tərzdə

**care-taker** ['keə,teɪkə^r] *n* 1. gözətçi, nəzarətçi; süpürgəçi; 2. ev xidmətçisi; bir şey üçün məsul olan şəxs;

◊ **Care-taker Government** ümumi seçkilərə qədər müvəqqəti olaraq ölkəni idarə edən hökumət

**careworn** ['keəwɔ:n] *adj* əldəndüşmüş, haldandüşmüş, yorğun, üzgün, tabsız, üzülmüş; **~ face** qayğıdan/dərddən üzülmüş sifət

**carfare** ['ka:feə^r] *n* nəqliyyatda gediş haqqı

**cargo¹** ['ka:gou] *n (pl* **-oes, -os** [ouz]) yük *(gəmi, təyyarə və s. ilə daşınan)*; **deck ~** göyərtədə daşınan yük; **general ~** qarışıq yük; **homeward /return ~** qayıdan baş gətirilən yük; **inward / outward ~** idxal / ixrac edilən yük; **to take in ~** yükləmək, yüklənmək, yük götürmək; **to carry ~** yük aparmaq/daşımaq; **to discharge ~** yükü boşaltmaq; **to transfer ~** yükü bir yerdən başqa yerə aparmaq

**cargo²** ['ka:gou] *adj* yük; yükdaşıyan; **~ plane** *hərb.* yükdaşıyan təyyarə; **~ ship** yük gəmisi,



yükdaşıyan gəmi; **~ and passenger ship** yük və sərnişin gəmisi; **~ capacity** yük tutumu, yükgötürmə / yükqaldırma qabiliyyəti; **~ truck** yük avtomobili

**caribou** ['kærɪbu:] *n zool.* karibu, kanada maralı

**caricature¹** [,kærɪkə'tjuə^r] *n* karikatura; *Newspapers often contain caricatures of well-known politicians Qəzetlərdə tez-tez tanınmış siyasətçilərin karikaturası olur*

**caricature²** [,kærɪkə'tjuə^r] *v* 1. karikatura şəklində / tərzində təsvir etmək, karikatura / şarj çəkmək; 2. ələ salmaq, masqaraya / lağa qoymaq, rişxənd / istehza etmək; 3. yaramaz tərzdə təqlid etmək

**caricaturist** [,kærɪkə'tjuərɪst] *n* 1. karikaturaçı, karikatura çəkən rəssam; şarj müəllifi; 2. satiraçı, parodist, satira / parodiya yazan

**caries** ['keəri:z] *n tib.* sümük çürüməsi xəstəliyi; karioz *(dişin çürüməsi)*

**carious** ['keərɪəs] *adj* çürüyən, çürük, kariozlu, çürümüş *(sümük, diş haq.)*

**carmine¹** ['ka:maɪn] *n* karmin *(al-qırmızı boyaq)*

**carmine²** ['ka:maɪn] *adj* al-qırmızı, al-qırmızı rəngdə

**carnage** ['ka:nɪdʒ] *n* qırğın, qırhaqır; *The battle field was a scene of carnage Döyüş meydanı əsl qırğın səhnəsi idi*

**carnal** ['ka:nl] *adj* 1. cismani, şəhvani; **~ pleasures** şəhvani zövq / ləzzət / nəşə; **~ desires** şəhvani meyl / arzu; *Carnal pleasures can destroy a man's soul Şəhvani nəşələr insan mənəviyyatını korlaya bilər*; 2. cismi, cismani; fiziki; **his ~ mother** onu doğan ana; 3. *d.d.* qanlı, qaniçən, qansoran, qana həris, qana susamış

**carnality** [ka:'nælɪtɪ] *n* 1. cismanilik, şəhvanilik; şəhvət; ehtiras; 2. mənəvi / ruhi marağın olmaması; ruhi kobudluq

**carnalize** ['ka:nəlaɪz] *v* ilhamdan/şövqdən/ruh yüksəkliyindən məhrum etmək, kobudlaşdırmaq, qabalaşdırmaq

**carnation** [ka:'neɪʃn] *n* 1.*bot.* qərənfil; 2. al-qırmızı və ya qırmızı rəng, qərənfil rəngi, 3. ət rəngi

**carneous** ['ka:nɪəs] *adj* ət rəngi

**carney** ['ka:nɪ] *v d.d.* yaltaqlanmaq, yaltaqlıq etmək; dilə tutmaq, tovlamaq

**carnifex** ['ka:nɪfeks] *n tar.* cəllad

**carnival** ['ka:nɪvəl] *n* 1. karnaval; *Rio de Janeiro's carnival is the best in the world Rio de Janeyro karnavalı dünyada ən yaxşısıdır*; 2. maslenitsa *(xristianlarda pəhriz bayramı)*

**carnivore** ['ka:nɪvɔ:^r] *n* 1. *zool.* yırtıcı/ətyeyən heyvan; 2. *bot.* həşəratyeyən bitki

**carnivorous** [ka:'nɪvərəs] *adj* 1. yırtıcı, ətyeyən; *Tigers are carnivorous animals Pələnglər yırtıcı heyvandır*; 2. həşəratyeyən, həşəratla qidalanan, cücüyeyən; **~ plants** həşəratyeyən / cücüyeyən bitkilər

**carol¹** ['kærəl] *n* şən mahnı *(xüs. Milad bayramı zamanı oxunan)*

**carol²** ['kærəl] *v* 1. şən mahnı oxumaq; 2. tərənnüm/mədh/vəsf etmək, tərifləmək; *The thankful people carolled their king Qədirbilən xalq öz krallarını mədh/vəsf etdi*

**carotid** [kə'rɔtɪd] *n anat.* yuxu arteriyası

**carousal** [kə'rauzəl] *n* içki və şənlik məclisi

**carouse¹** [kə'rauz] *n* içki məclisi

**carouse²** [kə'rauz] *v* sərxoşluq/əyyaşlıq etmək, vaxtını içki məclislərində keçirmək

**carousel** [,kæru'zel] *n* = **carousal**

**carp** [ka:p] *n zool.* sazan, çəki balığı

**carp** [ka:p] *v* 1. bəhanə axtarmaq, yersiz irad tutmaq, öcəşmək; qərəzkarlıqla / qərəzlə tənqid etmək; **to ~ at a writer** axtarıb yazıçının qüsurlarını /çatışmayan cəhətlərini tapmaq; 2. deyinmək, donquldanmaq, mırıldanmaq, söylənmək; 3. *d.d.* oxumaq *(mahnı)*; ifadəli oxumaq *(bədii əsəri)*

**carpal** ['ka:pəl] *adj tib.* kista; bilək

**carpenter¹** ['ka:pɪntə^r] *n* dülgər; xarrat; **to be a ~** dülgər / xarrat olmaq

**carpenter²** ['ka:pɪntə^r] *v* dülgərlik/xarratlıq etmək

**carpentry** ['ka:pɪntrɪ] *n* 1. dülgərlik, xarratlıq, dülgərlik/xarratlıq işi; 2. ağac emalı, ağac emal etmə işi

**carper** ['ka:pə^r] *n* 1. bəhanə axtaran/yersiz irad tutan/öcəşkən tənqidçi; 2. deyingən/daim donquldanan adam, mızı adam

**carpet¹** ['ka:pɪt] *n* 1. xalça, xalı, gəbə; **runner ~** ayaqaltı xalça, yol örtüyü, payəndaz; **magic ~** sehrli xalça; 2. örtük; **~ of leaves** yarpaq / xəzəl örtüyü; 3. süfrə, dəstərxan;

◊ **red ~** təntənəli görüş; **to roll out the red ~ for *smb.*** bir kəsi təntənəli surətdə / hörmətlə qarşılamaq; **on the ~** müzakirədə olma *(məsələ haq.)*; **to be on the ~** 1) müzakirə olunmaq, nəzərdən keçirilmək; söhbətin mövzusu olmaq; 2) qulaqburması almaq

**carpet²** ['ka:pɪt] *v* 1. döşəmək, örtmək, salmaq, sərmək *(xalça haq.)*, xalça ilə örtmək, xalça döşəmək/salmaq; 2. günahlandırmaq, irad tutmaq; *He was carpeted for bad work Pis işinə görə ona irad tutdular*

**carpetbag** ['ka:pɪtbæg] *n* xurcun

**carpeting** ['ka:pɪtɪŋ] *n* 1. ağır yun parça; cecim; 2. döşənək

**carpetless** ['ka:pɪtlɪs] *adj* xalçasız, xalça ilə döşənməmiş, xalça salınmamış

**carpet-moth** ['ka:pɪtmɔθ] *n* xalça/xalı/gəbə güvəsi

**carpet-slippers** ['ka:pɪt,slɪpəz] *n pl* isti ev ayaqqabısı, isti çəkələk

**carping** ['ka:pɪŋ] *adj* 1. acı, kəskin; **~ tongue** acı dil; 2. bədxah, qərəzkar

**carriage** ['kærɪdʒ] *n* 1. fayton, minik arabası; 2. sərnişin vaqonu; *I'll be sitting in the 3^rd car-*

*riage from the front of the train Mən qatarın əvvəlindən 3-cü vaqonda oturacam;* 3. *hərb.* top qundağı, top altlığı; 4. *av.* qondola *(hava balonunda, aerostatda və dirijabldа adamların oturduğu yer)*; 5. yükdaşıma; 6. duruş, qamət, vüqar, boy-buxun; **a graceful ~ of the head** başın vüqarlı duruşu;

◊ **~ trade** zəngin tamaşaçılar *(teatrda)*; zəngin alıcılar və ya sifarişçilər

**carriageable** ['kærɪdʒəbl] *adj* 1. rahat, işlək *(yol haq.)*; 2. portativ, yığcam, yanda gəzdirilə bilən; asan daşına bilən

**carriageway** ['kærɪdʒweɪ] *n* yolun nəqliyyat gedə biləcək hissəsi

**carrier**[1] ['kærɪə(r)] *n* 1. yükdaşıyan, yükçü, hambal; 2. kuryer; *He worked as a carrier between banks in the city O, şəhərdə banklar arasında kuryer işləyirdi;* 3. *amer.* poçtalyon; 4. arabaçı, yükdaşıyan, bərəçi, salçı, kirayəçi; 5. nəqliyyat agentliyi, nəqliyyat idarəsi; nəqliyyat gəmisi; **cargo ~** yük gəmisi, yükdaşıyan gəmi; **timber ~** taxta-şalban/ağac daşıyan *(gəmi, avtomobil, vaqon və s.)*; 6. yük yeri *(motosikletdə)*; 7. *tib.* basildaşıyan, basilyayan; xəstəlik törədicilərinin daşıyıcısı; 8. poçt göyərçini; 9. *tex.* konteyner; 10. transportyor, konveyer

**carrier**[2] ['kærɪə(r)] *adj*: **~ point** nəqliyyata yükvurma məntəqəsi; **~ truck** *amer.* irihəcmli və ağır yükləri daşımaq üçün yük maşını; **~ vehicle** 1) nəqliyyat vasitəsi; 2) raket daşıyıcısı, raketi orbitə çıxaran

**carrier-dog** ['kærɪədɔg] *n* 1. yükdaşıyan it; 2. *hərb.* rabitə iti

**carrier-pigeon** ['kærɪə,pɪdʒɪn] *n* poçt göyərçini

**carrier-plane** ['kærɪə,pleɪn] *n hərb.* göyərtəli təyyarə

**carrier-rocket** ['kærɪə,rɔkɪt] *n* raket daşıyıcısı

**carrion**[1] ['kærɪən] *n* 1. leş, cəmdək; 2. istifadə üçün yararsız ət

**carrion**[2] ['kærɪən] *adj* 1. çürük, iyimiş, qoxumuş; 2. iyrənc, çox pis, mənfur

**carrion crow** ['kærɪən'krou] *n zool.* leşyeyən iri qara qarğa; çalağan

**carrot** ['kærət] *n bot.* kök, yerkökü

**carroty** ['kærətɪ] *adj* 1. kök rəngi; 2. kürən, sarı-qırmızı, sarı *(xüs. saç haq.)*

**carrousel** [,kæru'zel] *n* karusel

**carry**[1] ['kærɪ] *n* 1. daşıma, daşınma; aparma, aparılma; 2. uzaqvurma qabiliyyəti *(top haq.)*; uçma məsafəsi *(mərmi, güllə və s. haq.)*; 3. *id.* tutma, saxlama *(fiqurlu sürüşmə zamanı)*

**carry**[2] ['kærɪ] *v* *(pt, pp* **carried)** 1. aparmaq, daşımaq, gətirmək; **to ~ a bundle in *one's* arms** əlində bağlama aparmaq; *The monkey carried her baby on her back Meymun balasını dalında apardı; Porters carried trunks on their shoulders Hamballar camadanları çiyinlərində daşıdılar; A taxi carried me to the station Taksi məni vağzala gətirdi / apardı;* 2. keçirtmək; **to ~ the war into the enemy's country** 1) müharibəni düşmənin ölkəsinə keçirtmək; 2) *məc.* qarşılıqlı ittiham irəli sürmək; **to ~ the fight to the enemy** düşmən mövqeyinə soxulmaq; 3. daşımaq, aparmaq; **to ~ by rail** dəmir yolu ilə daşımaq; *Railways and ships carry goods Dəmir yolu və gəmilər mal daşıyır;* 4. gəzdirmək, geymək, taxmaq; **to ~ a watch** saat geymək/taxmaq; *I never carry a walking-stick Mən heç vaxt əl ağacı gəzdirmirəm; I never carry much money about me Mən heç vaxt yanımda çoxlu pul gəzdirmirəm;* **to ~ arms** silah gəzdirmək; 5. olmaq, daxilində / tərkibində olmaq; *The book carries many tables Kitabda çoxlu cədvəl var; The hospital carries a good staff Xəstəxanada yaxşı işçi heyəti var;* **to ~ a wound** yarası olmaq; **to ~ one** *riyaz.* biri yadda saxlamaq; **to ~ a price /a value** qiyməti / dəyəri olmaq; 6. satmaq, alver etmək; *This shop does not carry fruit Bu mağaza meyvə satmır;* 7. keçirmək, vermək, yaymaq, yetirmək; *Wires carry sound Məftillər səs keçirir; Pipes carry water Su borularla verilir; He carried the news to everyone in the village O, xəbəri bütün kəndə yaydı;* 8. çəkmək *(elektrik boru haq.)*; 9. eşidilmək, çatmaq, gəlmək *(səs, xəbər haq.)*; *The sound of the firing carried many miles Atəş səsi bir neçə mil məsafədə eşidilirdi; Their guns wouldn't carry as far as the enemy ships Onların mərmiləri düşmən gəmilərinə qədər çatmadı;* 10. əldə etmək, sahib olmaq, zəbt etmək; **to ~ a position** vəziyyəti ələ almaq; 11. qələbə qazanmaq, udmaq *(yarış və s. haq.)*; **to ~ an election** seçkini udmaq, seçkidə qələbə qazanmaq; **to ~ a case** *hüq.* işi udmaq; 12. tutmaq, almaq, ələ keçirmək, zəbt etmək; **to ~ a position** vəziyyət tutmaq; **to ~ by storm** hücumla ələ keçirmək; **to ~ a fortress** qalanı zəbt etmək / ələ keçirmək; 13. qələbə çalmaq / qazanmaq, udmaq *(yarışı, oyunu və s.)*; 14. nail olmaq; müdafiə etmək, qorumaq; sübut etmək; **to ~ *one's* point** öz mövqeyini müdafiə etmək; *I have carried my point Mən haqlı olduğumu sübut etdim;* 15. qəbul etmək *(qərar)*; *The resolution / The bill was carried Qətnamə / Qanun layihəsi qəbul edildi;* **to ~ a motion by a large majority** təklifi böyük əksəriyyətlə qəbul etmək; 16. irəli sürmək *(namizəd haq.)*; 17. hamilə olmaq; **to ~ a boy** oğlan uşağına hamilə / boylu olmaq; 18. *hərb.* tüfəngi çiyinə götürmək; **to ~ along** çox maraqlandırmaq, məftun/valeh etmək; *We were carried along by his speech Onun nitqi bizi valeh etmişdi;* **to ~ away** 1) aparmaq, götürüb aparmaq/getmək; *The storm carried away the sails Tufan yelkənləri götürüb apardı;* 2) son dərəcə maraqlandırmaq, cəlb/cəzb etmək; məftun/valeh etmək; *He was carried away by the music Musiqi onu məftun / valeh etdi;* **to be carried away by temptation** tamaha düşmək, tamahın əsiri olmaq; 3) həyəcanlanmaq, özündən çıxmaq; *Jane got so carried away when arguing with her husband that she killed him Əri ilə mübahisə edərkən Ceyn elə həyəcanlandı ki, onu öldürdü/qətlə yetirdi;* **to ~ back** 1) geri qaytarmaq; 2) geri qayıtmaq, geriyə nəzər salmaq; *Let me carry you back to the day when we first met İcazə ver / verin yadına / yadınıza ilk görüşdüyümüz günü salım; That carries me back to my youth Bu məni gəncliyimə qaytarır;* **to ~ down** aşağı aparmaq; *The body was carried down by the stream Cəsəd axın aşağı getdi;* **to ~ on** 1) davam etdirmək; *Carry on! İşi davam etdir / etdirin!;* 2) bir şeylə məşğul olmaq; **to ~ on a conversation with *smb.*** bir kəslə söhbəti davam etdirmək; *We'll carry on our conversation tomorrow Biz söhbətimizi sabah davam etdirərik;* 3) özündən çıxmaq, hirslənmək; *Don't carry on so! Özünü / Özünüzü ələ al/alın!;* **to ~ out** 1) bitirmək, sona çatdırmaq, başa vurmaq; 2) yerinə yetirmək *(planı, tapşırığı və s.)*, keçirmək *(təcrübə tədbir və s.)* **to ~ out tests** təcrübə keçirmək; **to ~ off** qalib gəlmək, priz almaq; *Nancy carried off all the prizes in the competition Nənsi yarışda butun prizləri aldı;* 3) cənazəni/meyiti aparmaq; **to ~ through** 1) yerinə yetirmək, həyata keçirmək; 2) kömək etmək, müdafiə etmək; *His courage will carry him through Onun cəsarəti ona qələbə gətirəcək;*

◊ **to ~ all / everything before one** 1) bütün maneələri dəf etmək; 2) böyük qələbə qazanmaq, böyük nailiyyət əldə etmək; **to ~ into effect** həyata keçirmək, icra etmək; **to ~ the day** qələbə qazanmaq, qalib gəlmək; **to fetch and to ~ *(for)*** buyruq qulu olmaq, buyruqları yerinə yetirmək, əmrə hazır/müntəzir olmaq; **to ~ conviction** inandırmaq, sübut etmək; razı salmaq, qane etmək; **to ~ weight *(with)*** çəkisi / təsiri olmaq; **to ~ *smb.* high *(and dry)*** *amer.* bir kəsi cırnatmaq/ələ salmaq

**carryall** ['kærɪ'ɔ:l] *n* iri həcmli çamadan

**carry-tale** ['kærɪteɪl] *n d.d.* xəbərçi, sözgəzdirən, qeybətçi, dedi-qoduçu

**carsick** ['ka:sɪk] *adj* maşında/tramvayda və s. gedərkən ürəyi bulanan; *I was carsick Məni maşın tutdu (yəni maşında ürəyim bulandı)*

**cart**[1] [ka:t] *n* 1. araba; 2. əl arabası;

◊ **to put/to set the ~ before the horse** işi tərsinə /baş-ayaq görmək / tərs başa düşmək; **to be in the ~** çətin / çıxılmaz vəziyyətdə olmaq

**cart**[2] [ka:t] *v* araba ilə getmək / aparmaq

**cartable** ['ka:təbl] *adj* 1. araba ilə daşına bilən / daşınması mümkün olan; 2. araba ilə getməyə yararlı olan *(yol haq.)*



**cartage** ['ka:tɪdʒ] *n* 1. araba ilə daşınma *(yük haq.)*; 2. araba ilə aparılan yükün daşınma xərci

**cartel** [ka:'tel] *n* 1. kartel *(iri kapitalist sənayesinin inhisarçı birləşməsi)*; 2. kartel *(saziş, müqavilə; siyasi partiyaların birləşməsi)*; 3. əsirlərin dəyişdirilməsi; 4. kartel *(duelə yazılı çağırış)*; 5. mətn yazılmış vərəq və ya kartoçka

**carter** ['ka:tə(r)] *n* arabaçı, araba sürən

**cartful** ['ka:tful] *n* bir araba, araba dolusu

**carthead** ['ka:thed] *n* qozla, şahnişin *(arabanın qabaq hissəsi)*

**cart-horse** ['ka:thɔ:s] *n* araba / yük atı

**cart-house** ['ka:thaus] *n* araba saxlamaq üçün çardaq / talvar

**cartilage** ['ka:tɪlɪdʒ] *n* qığırdaq, xımırçək, xirtdənək; *Cartilage protects the joints Qığırdaq oynaqları müdafiə edir; There is a cartilage in the nose Burunda xımırçək var*

**cartilaginous** [,ka:tɪ'lædʒɪnəs] *adj tib.* qığırdaq, qığırdağabənzər, qığırdağaoxşar, xımırçəyəbənzər, xımırçəyəoxşar

**cart-load** ['ka:tloud] *n* araba, yüklü araba *(yük ölçüsü kimi)*; **two ~s of hay** iki araba ot

**cart-man** ['ka:tmən] *n (pl* **-men** [mən]) arabaçı, kirəçi, yükdaşıyan

**cartogram** ['ka:təgræm] *n* kartoqram *(statik məlumatı kağız üzərində rəqəmlərlə göstərən çizgi)*

**cartographer** [ka:'tɔgrəfə(r)] *n* kartoqraf, xəritəçi *(coğrafiya xəritələri çəkən mütəxəssis)*

**cartographic** [,ka:tou'græfɪk] *adj* kartoqrafiya

**cartographical** [,ka:tou'græfɪkl] *adj* = **cartographic**

**cartography** [ka:'tɔgrəfɪ] *n* kartoqrafiya *(coğrafiya xəritələri çəkmək üsullarından bəhs edən elm)*

**cartomancy** ['ka:toumænsɪ] *n* qumar kağızı ilə fala baxma / fal açma

**carton** ['ka:tn] *n* karton qutu; faner qutu; nazik karton

**cartoon**[1] [ka:'tu:n] *n* 1. karikatura; 2. *komik və ya satirik məzmuna malik olan şəkil*

**cartoon**[2] [ka:'tu:n] *v* 1. karikatura çəkmək; 2. karikatura şəklində təsvir etmək; şarj çəkmək

**cartoonist** [ka:'tu:nɪst] *n* karikaturist *(karikatura çəkən rəssam)*

**cartridge** ['ka:trɪdʒ] *n* 1. *hərb.* patron, güllə; 2. plyonka çarxı *(foto üçün)*

**cartridge-belt** ['ka:trɪdʒbelt] *n* patrondaş *(patron qabı)*

**cartridge-body** ['ka:trɪdʒ,bɔdɪ] *n hərb.* gilizin gövdəsi

**cartridge-box** ['ka:trɪdʒbɔks] *n* 1. patron qutusu; 2. patrondaş *(patron qabı)*

**cartridge-case** ['ka:trɪdʒkeɪs] *n* 1. *hərb.* patron gilizi; 2. patrondaş *(patron qabı)*

**cartridge-chamber** ['ka:trɪdʒ,tʃeɪmbə(r)] *n hərb.* xəznə, sandıq *(tüfəngdə)*

**cartridge-clip** [ˈka:trıdʒklıp] *n* *hərb.* patron darağı
**cartridge-drum** [ˈka:trıdʒdrʌm] *n* *hərb.* dairəşəkilli / dairəvi sandıq
**cartridge-paper** [ˈka:trıdʒ.peıpəʳ] *n* qalın kağız *(şəkil çəkmək və ya patron gilizi qayırmaq üçün)*
**cart-track** [ˈka:ttræk] *n* = **cart-way**
**cart-way** [ka:tweı] *n* araba yolu, kəndarası yol
**cart-wheel**[1] [ˈka:twı:l] *n* araba təkəri
**cart-wheel**[2] [ˈka:twı:l] *v* təkər kimi fırlana-fırlana hərəkət etmək
**cart-whip** [ˈka:twıp] *n* araba qamçısı, uzun qamçı
**cartwright** [ˈka:traıt] *n* karet ustası, karet qayıran
**carve** [ka:v] *v* **1.** oymaq, həkk etmək *(ağac və ya sümük üzərində)*; **2.** bölmək; **to ~ in two** ikiyə bölmək; **to ~ in / to pieces** doğram-doğram etmək, parça-parça kəsmək; **3.** kəsmək, doğramaq *(bişmiş əti)*
**carven** [ˈka:vən] *adj* oyulmuş; kəsilmiş, naxışlanmış; naxış açılmış *(sümük haq.)*; taraşlanmış; yonulmuş *(mərmər haq.)*
**carver** [ˈka:vəʳ] *n* **1.** həkkak, oyucu *(daş, ağac, sümük və s. üzərində naxış açan usta)*; **2.** oymaçı; **3.** heykəltəraş *(mərmər və s. materiallardan yonma yolu ilə müxtəlif şeylər düzəldən)*; **4.** ət kəsmək üçün bıçaq
**carving** [ˈka:vıŋ] *n* **1.** oyma, naxış *(ağac, sümük və s. üzərində)*; naxış ornamenti / bəzəyi; **2.** naxış işi; mişarlanma; **3.** kəsmə, doğrama, kəsilmə, doğranma; kərtmə, çərtmə; **4.** kəsmə, doğrama *(bişmiş ət və s.)*
**cascabel** [ˈka:skəbel] *n* *zool.* zınqırovlu ilan *(isti ölkələrdə yaşayan zəhərli ilan)*
**cascade**[1] [kæsˈkeıd] *n* şəlalə, kiçik şəlalə; **to fall in ~s** şəlalə kimi tökülmək; *Her hair fell over her shoulders in a cascade of curls Onun saçları qıvrılaraq çiyinlərinə şəlalə kimi tökülmüşdü*
**cascade**[2] [kæsˈkeıd] *v* şəlalə kimi yuxarıdan aşağı axmaq/tökülmək; *When it rained, water would cascade down the window Yağış yağanda su pəncərədən şəlalə kimi axardı / tökülərdi*
**case**[1] [keıs] *n* I **1.** hadisə, hal, macəra, sərgüzəşt, qəza, qəziyyə, əhvalat; vəziyyət, şərait; **the ~ in point 1)** məsələyə aid olan hadisə; həmin / bu məsələ; **2)** müvafiq misal; **in any ~** hər halda, nə təhər olsa; **in no ~** əsla, qətiyyən, heç bir vəchlə, heç vaxt; **in the ~ of** barəsində, haqqında; gəlincə, gəldikdə, qaldı ki; **in the ~ of children under 14** 14 yaşında uşaqlara gəldikdə / gəlincə; *That is the case Məsələ bax belədir; It / That is not the case Məsələ belə deyil; Is it the case that he has lost his job? Doğrudanmı, o, işini itirib? If that's the case Əgər məsələ belədirsə, Əgər həqiqət belədirsə; Such is the case with us Bax bizim vəziyyətimiz belədir;* **as the ~ may / might be** vəziyyətdən asılı olaraq, **as the ~ stands** indiki vəziyyətdə; *I cannot make exception in your case Mən sənə / sizə heç bir güzəştə gedə bilmərəm;* **to meet the ~ 1)** tələbə cavab vermək; **2)** məsələni həll etmək; **as the ~ may require** vəziyyətin tələb etdiyi kimi; *This is the case for the dean to decide Belə işləri dekan həll edir; If I were in your case d.d. Sənin / Sizin yerində / yerinizdə olsa idim; Suppose the case were yours (Belə) fərz et / edin ki, məsələnin sənə / sizə dəxli olaydı; It / This is another case Bu, başqa məsələdir;* **2.** dəlil, sübut, əsas; arqument; fikir, mülahizə; **the ~ for / against** lehinə / əleyhinə arqument; **the ~ for disarmament** tərksilah lehinə gətirilən sübut/dəlil; *There is the strongest case for self-government Bu muxtariyyət lehinə ən güclü mülahizə/sübut var;* **to have a good ~ here** tutarlı əsası / dəlili / mülahizəsi olmaq; *You have a good case here Bu, çox inandırıcı görünür;* **to make out a ~** sübut etmək *(nəyisə)*; **to make out** ***one's*** **~** özünün haqlı olduğunu sübut etmək; **to state** ***one's*** **~** özünün mühakiməsini/mülahizəsini irəli sürmək; **to base** ***one's*** **~ on** ***smth.*** arqumentini bir şeylə əsaslandırmaq; **to press** ***one's*** **~** öz nöqteyi-nəzərini ciddiyyətlə sübut etmək; **3.** *hüq.* məhkəmə işi; **criminal ~s** cinayət işləri; **to try a ~** məhkəmə etmək, işə baxmaq; *The case will be tried tomorrow İşə sabah baxılacaq;* **the ~s for the defendant** müttəhimin xeyrinə olan sübutlar / faktlar; **4.** nəzarət altında olan şəxs/xəstə / yaralı; **cot / lying-down ~** yataqda olan xəstə; **walking ~** ambulator /ayaqüstə olan xəstə; **mental ~** ruhi xəstə; *tib.* **~ history** xəstəlik tarixi; *She is a difficult case Onunla dolanmaq çətin işdir / məsələdir; This child is a difficult case Bu çox çətin uşaqdır;* **5.** vəziyyət; hal, əhval; **out of ~** fiziki cəhətdən pis vəziyyətdə olma; xəstə olma; **6.** *qram.* hal; **genitive ~** yiyəlik halı; **accusative ~** təsirlik halı;
◊ **just in ~** hər cür halda, hər ehtimala qarşı
**case** [keıs] *n* II **1.** qutu, yeşik; mücrü, sandıqça; konteyner; **cigarette ~** port-siqar, papirosqabı, papirosqutusu; **2.** çanta, sumka; çamadan; neseser *(içərisində xırda tualet şeyləri olan qutu)*; **vanity ~** qadın neseseri *(içərisində kirşan, ənlik və s. olan qutu)*; **3.** futlyar, qab, qutu, çexol; **4.** qın *(xəncər, qılınc və s. üçün)*; **5.** papaq, örtük; şin *(avtomobildə)*; çexol *(futbol topunda)*; **6.** gövdə, korpus, çanaq *(saatda və s.)*; **7.** *tex.* karter *(içərisində mexanizm olan metal qutu)*; **8.** *hərb.* giliz *(patronun barıt doldurulan hissəsi)*; **9.** komplekt, dəst *(alət və s.)*; **~ of drawing instruments** qotovalnya *(çertyoj alətləri komplekti)*; **10.** vitrin *(mağaza sərgisi)*; **11.** balaca şkaf *(büllur qablar üçün)*; **12.** kitab şkafı; **13.** balışüzü, yastıqüzü
**case**[2] [keıs] *v* **1.** qutuya/yeşiyə qoymaq, qutuya/yeşiyə qablamaq; **2.** sağanağa/çərçivəyə salmaq; **3.** **(with, in)** örtmək; çəkmək; *The copper was cased with silver Misin üzərinə gümüş çəkilmişdi, Misin üstü gümüşlə örtülmüşdü;* **4.** köbələmək, göbə tikmək; üz vurmaq / çəkmək; **to ~ a brick wall with stone** kərpic divara daşdan üz çəkmək; **to ~ up** qablamaq, qablaşdırmaq; *The vase was cased up for transport Vaza nəqliyyatda daşınmaq üçün qablaşdırıldı*
**casebook** [ˈkeısbuk] *n* xəstələrin qeydiyyat kitabı
**case ending** [ˈkeıs.endıŋ] *n* *qram.* hal şəkilçisi; **'s** *is the possessive case-ending* **'s** *yiyəlik hal şəkilçisidir*
**casein** [ˈkeısıın] *n* *kim.* kazein *(südün tərkibində olan zülali maddə)*
**cash**[1] [kæʃ] *n* **1.** nağd pul; *I have no cash on me, can I pay you tomorrow? Mənim üstümdə/yanımda nağd pulum yoxdur, mən hesabı sabah ödəyə bilərəmmi?;* **hard ~ 1)** nağd pul *(hər formada)*; **2)** *d.d.* pul; **spare ~** artıq pul; **prompt ~** təxirə salınmadan nağd pulla hesablaşma; **~ in hand, ready ~** nağd pul; **to pay ~** yerindəcə hesablaşmaq / haqq-hesabı üzmək, borcu ödəmək; **by/in ~** nağd pulla; **~ with order** sifariş verərkən nağd pulla ödəmə; **2.** kassa
**cash**[2] [kæʃ] *adj:* **~ remittance** pul köçürmə; **~ payment** nağd pulla ödəmə / ödəniş; **~ sale** nağd pula satma; **~ price** nağd pulla ödəmə qiyməti; **~ audit** kassanı təftiş etmə; kassanın təftişi; **~ register** kassa aparatı, kassa; **~ tenant** pulla ödəyən icarədar; **~ crop** *k.t.* satlıq məhsul
**cash**[3] [kæʃ] *v* nağd pula çevirmək; nağdlaşdırmaq; *Can you cash this postal order Sən / Siz bu bəratı ödəyə bilərsənmi / bilərsinizmi?;* **to ~ a check/a draft** çeklə pul almaq, çeki pula dəyişmək;
◊ **to ~ in on** ***smth.*** *amer.* bir şeydən varlanmaq / dövlətlənmək; bir şeyi öz xeyrinə döndərmək
**cashable** [ˈkæʃəbl] *adj* reallaşdırılan; satıla bilən, satılıb pula çevrilə bilən
**cash-book** [ˈkæʃbuk] *n* kassa kitabı
**cashier**[1] [kæˈʃıəʳ] *n* kassir
**cashier**[2] [kæˈʃıəʳ] *v* **1.** yaramaz hərəkətə görə hərbi xidmətdən kənar etmək; **2.** vəzifəsini/rütbəsini alçaltmaq, vəzifədən kənarlaşdırmaq; biabırçılıqla qovmaq
**cashmere** [kæʃˈmıəʳ] *n* **1.** kəşmir, kəşmiri şal *(nazik yumşaq yun parça)*; **2.** yun iplik *(keçi yunundan əyirilmiş)*
**casing** [ˈkeısıŋ] *n* **1.** haşiyə tikmə/vurma, köbələmə; haşiyə, köbə; üz çəkmə; **2.** örtük; sağanaq; **3.** *tex.* karter *(mexanizmi zədələnməkdən və tozdan qorumaq üçün qurğu)*
**casing-paper** [ˈkeısıŋ.peıpəʳ] *n* qablamaq üçün kağız, qablama kağızı
**casings** [ˈkeısıŋz] *n pl* bağırsaq *(kolbasa məmulatı üçün)*
**casini** [kəˈsi:nı] *n* **casino** *isminin cəm forması*
**casino** [kəˈsi:nou] *n (pl -nos)* kazino *(qumarxana, kefxana)*
**cask**[1] [ka:sk] *n* **1.** boçka, çəllək *(kiçik həcmli)*; **2.** konteyner;
◊ *The cask savours of the first fill ≅ Nə tökərsən aşına, o da çıxar qarşına/ qaşığına*
**cask**[2] [ka:sk] *v* boçkaya tökmək / qoymaq
**casket**[1] [ˈka:skıt] *n* **1.** mücrü, sandıqça, qutu; **2.** *amer.* tabut; **3.** konteyner *(radioaktiv materiallar üçün)*
**casket**[2] [ˈka:skıt] *v* **1.** mücrüdə/ sandıqçada gizlətmək; **2.** *amer.* tabuta qoymaq
**cassation** [kæˈseıʃn] *n* *hüq.* kassasiya; **court of ~** kassasiya məhkəməsi
**cassette** [kəˈset] *n* **1.** mücrü, sandıqça; **2.** *foto* kaset *(foto plastinkaları saxlamaq üçün işıq keçirməyən qutu)*
**cassowary** [ˈkæsəweərı] *n* *zool.* kazuar *(qanadları inkişaf etməmiş itiqaçan böyük quş)*
**cast**[1] [ka:st] *n* **1.** tullama; tolazlama; atma; **~ of net** tor atma *(balıq tutmaq üçün)*; **a stone's ~ (from) 1)** daş atma məsafəsi; **2)** yaxınlıqda, əl altında *(yəni yaxınlıqda)*; **2.** atma *(aşıq oyununda)*; **3.** risk, şans; **to stake / to set / to put on a ~** risk etmək, qumara qoymaq; **the last ~** son imkan / şans; **4.** tale, alın yazısı; qismət, bəxt; **5.** müəyyən miqdar; istehsal edilən / olunan məhsulun miqdarı; **a year's ~ of lambs** *k.t.* illik quzu doğumu; **6.** tullanan; dəyişilən *(ilan qabığı və s.)*; **7.** *teatr. kino* **1)** iştirakçıların tərkibi; **2)** rolların bölünməsi; **3)** iştirakçılar heyəti; **good ~** güclü / yaxşı tərkib; **to choose the ~** iştirakçıları seçmək; **8.** nümunə; örnək; timsal, model, forma, çeşid; **a ~ of** ***smb.'s*** **trade** bir kəsin ustalığının nümunəsi; **a ~ of cunning** məkrliliyin timsalı; **9.** xasiyyət, xüsusiyyət, tərz; **~ of mind** düşüncə tərzi; **~ of countenance** sifət, zahiri görünüş; **men of one ~** eyni xasiyyətə malik adamlar; **~ of sentence** cümlənin quruluşu; **10.** surət *(heykəl və s. surəti)*; **to take a ~ of** ***smth.*** bir şeyin surətini çıxarmaq; **11.** *tib.* gips, sarğı; **12.** çalar, çalarlıq, rəngə çalma; **greenish ~** yaşıl rəngə çalma; yaşıla çalma, yaşımtıllıq; **13.** baxış; gözün ifadəsi; **14.** *amer.* zənn, güman, təxmin; fərasət, fəhm; tez başa düşmə; qabaqcadan demə, gələcəyi xəbər vermə; proqnoz; **15.** *tex.* tökmə; tökülmə *(qəlib vasitəsilə)*: tökmə şeylər / məmulat; tökmə üçün qəlib / forma
**cast**[2] [ka:st] *v (pt, pp* **cast***)* **1.** tullamaq, atmaq; salmaq; tolazlamaq; **to ~ the lead lot** dənizin dərinliyini ölçmək üçün cihaz atmaq; **to ~** ***smth.*** **ashore** bir şeyi sahilə atmaq; **to ~ into prison** həbsxanaya atmaq; **to ~ a shoe** nalı salmaq *(at haq.)*; *The fishermen cast their nets into the sea Balıqçılar torlarını dənizə atdılar;* **2.** salmaq, yıxmaq; çıxartmaq; *The horse cast its rider At süvarini yıxdı;* **to ~** ***one's*** **clothes** paltarını çıxartmaq/çıxarıb atmaq; **to ~ from the throne** taxt-tacdan salmaq / devirmək; **to ~ oneself** atılmaq *(bir kəsin ayağına)*; **3.** *tex.* tök-

mək, tökmə üsulu ilə hazırlamaq *(metal şeylər haq.)*; **to ~ bronze/metal** bürünc/metal tökmək; *Iron casts better than copper Dəmir misdən yaxşı töküür*; 4. *hüq.* hökm çıxartmaq; **to ~ for transportation** sürgün olunmağa məhkum etmək; 5. yaramaz hesab etmək *(at və s.)*; 6. azad/kənar etmək, çıxarmaq *(işdən, vəzifədən)*, buraxmaq; qovmaq; 7. *arx.* qabaqcadan xəbər vermək; 8. itirmək, dəyişmək; tökmək; *(dişi, yarpağı, buynuzu, qabığı)*; **to ~ its coat** qabıqdan çıxmaq, tükünü tökmək; *The snake casts (off) its skin every year İlan hər il qabığını dəyişir*; 9. *teatr. kino* rol vermək, rolları bölüşdürmək; **to ~ actors for parts** aktyorları rollara təyin etmək; *She was badly cast Ona müvafiq rol vermədilər*; 10. yerləşdirmək, yerbəyer etmək, sahmanlamaq; **to ~ facts under heads** faktları müvafiq bölmələr üzrə yerləşdirmək; 11. bala salmaq, vaxtından əvvəl doğmaq *(heyvanlar haq.)*; 12. salmaq *(nəzər, işıq, kölgə və s.)*, **to ~ a look/a glance/an eye at (over, on) smth.** bir şeyə nəzər salmaq/baxmaq /göz atmaq; **to ~ light upon smth.** bir şeyin üstünə işıq salmaq, bir şeyə aydınlıq gətirmək, bir şeyi aydınlaşdırmaq; **to ~ the blame on smb.** günahı bir kəsin boynuna atmaq; **to ~ a shadow** kölgə salmaq; 13. hesablamaq, nəticə vurmaq; **to ~ about** düşünmək, fikirləşmək, ətraflı düşünmək, götür-qoy etmək; **to ~ aside** rədd etmək; bir tərəfə qoymaq/atmaq; **to ~ one's care aside** qayğıdan əl çəkmək, qayğısını əsirgəmək; **to ~ away** tənha buraxmaq, tənha qalmaq; *We were cast away on an island without food and water Biz bir adada çörəksiz və susuz tənha qalmışdıq*; **to ~ back** geri atmaq, rədd etmək *(ittihamı)*; **to ~ one's thoughts back on the past** fikrən keçmişə dönmək /qayıtmaq; **to ~ down** 1) dağıtmaq, yıxmaq, uçurmaq, viran etmək; 2) devirmək; yıxmaq; 3) endirmək, salmaq *(gözünü və s.)*; 4) əzmək, incitmək, əziyyət / sıxıntı vermək; *Don't get cast down Ruhdan düşmə/düşməyin, Məyus olma/olmayın; Father was very cast down by the news of our aunt's death Bizim bibimizin ölümü atamızı bərk kədərləndirmişdi*; **to ~ off** 1) atmaq, tullamaq; 2) imtina etmək, əl çəkmək; *The parents cast off their daughter Valideyinlər qızlarından imtina etdilər*; **to ~ out** 1) qovmaq, qovlamaq, rədd etmək; 2) qəflətən qusmaq *(yeməyi)*; 3) yekun vurmaq, hesablamaq;

◊ **to ~ a vote** səs vermək *(seçkidə)*; **to ~ a spell upon smb.** bir kəsi məftun etmək, bir kəsi ovsunlamaq; **to ~ lots** püşk atmaq; **to ~ one's lot with smb.** öz taleyini bir kəslə bağlamaq; **to ~ smth. in smb.'s teeth** bir kəsi bir şeydə qınamaq/danlamaq/məzəmmət etmək; **to ~ beyond the moon** xəyala dalmaq, fikrən göylərə qalxmaq, xəyala qapılmaq

**castanets** [.kæstə'nets] *n* kastanyet *(barmaqlara taxılaraq rəqs zamanı musiqi taktına uyğun surətdə şıqqıldadılan şaxşax)*

**caste** [ka:st] *n (Hindistanda)* 1. kasta; silk, qrup, təbəqə; *He belonged to the lowest caste and so he could not marry the princess O lap aşağı silkə mənsub olduğu üçün prinseslə/şahzadə xanımla evlənə bilmədi*; 2. *d.d.* irq; cins; mənşə

**castellated** ['kæsteleıtıd] *adj* 1. qəsr tərzində tikilmiş; 2. dişli, diş-diş *(divar haq.)*; 3. *tex.* dişli; **~ nut** dişli qayka

**castellation** [.kæstə'leıʃn] *n* 1. qəsr tikmə; 2. dişli divar tikmə

**castellet** ['kæstılıt] *n* balaca qəsr; mülkədar malikanəsi / evi

**caster** ['ka:stə$^r$] *n* 1.: **~ of the evil eye** bədnəzərli/gözüdəyməcəli adam; 2. tökməçi *(metal tökən fəhlə)*; 3. = **castor** I; 4. hesablayan, hesablayıcı; **~ of accounts** hesabat tərtib edən; 5. rolları bölən/bölüşdürən

**castigate** ['kæstıgeıt] *v* 1. qamçılamaq, şallaqlamaq, qırmaclamaq; amansız surətdə ittiham etmək, kəskin tərzdə tənqid etmək; üstünə düşmək; 2. cəzalandırmaq, cəza vermək; döymək *(çubuqla)*; 3. düzəltmək; islah etmək *(çatışmazlıqları)*; aradan qaldırmaq *(qüsurları, nöqsanları)*

**castigation** [.kæstı'geıʃn] *n* 1. qamçılama, şallaqlama; ifşa etmə; ciddi tənqid; şiddətli töhmət; pərən-pərən salma; 2. cəzalandırma, cəza vermə; 3. düzəltmə, düzəldilmə; islah etmə, düzəliş, təshih

**castigator** ['kæstıgeıtə$^r$] *n* 1. qamçılayan, şallaqlayan; 2. ifşaçı, ifşa edən; 3. cəza verən, cəzalandıran *(adam)*

**castigatory** ['kæstıgeıtərı] *adj* 1. qamçılayan, qırmaclayan; ifşa edən; şiddətli; ifşaedici; amansız; 2. cəzalandıran, cəzaverici; 3. islahedici, düzəldici

**casting$^1$** ['ka:stıŋ] *n* 1. atma, tullama; 2. dəyişmə *(buynuzu, qabığı və s.)*; 3. hesablama, hesablanma; yekun, nəticə; 4. *teatr. kino* rolların bölünməsi; aktyorların seçilməsi; 5. *tex.* tökmə *(polad və s.)*, tökülmə *(qəlib vasitəsilə)*

**casting$^2$** ['ka:stıŋ] *adj* 1. atan, tullayan; 2. həlledici; *The chairman has the casting vote / voice Səslər eyni olduqda sədrin səsi həlledici olur*

**casting-bottle** ['ka:stıŋ.bɔtl] *n* ətir üçün şüşə

**cast-iron** ['ka:st.aıən] *adj* 1. çuqun, çuqundan qayrılmış / hazırlanmış; 2. möhkəm, inadlı, yolagetməz, yolagəlməz, höcət; sarsılmaz; dözümlü; **~ nature** möhkəm/sarsılmaz xarakter; **~ will** sarsılmaz iradə; **~ policy** dönməz siyasət; *She has a cast-iron stomach; she can eat anything Onun möhkəm mədəsi var; nə desən / nə olsa yeyə bilir*

**castle$^1$** ['ka:sl] *n* 1. qəsr, qala; saray; *An Englishman's house is his castle İngilisin evi onun qalasıdır /qəsridir*; 2. *şahm.* top; 3. *şair.* gəmi;



◊ **to build ~s in the air** ≅ xəyala qapılmaq, xəyalplov yemək, dəryada balıq sövdəsi etmək

**castle$^2$** ['ka:sl] *v* 1. qalaya/qəsrə salmaq; 2. *şahm.* rokirovka etmək, qala qurmaq

**castle-builder** ['ka:sl.bıldə$^r$] *n* xəyalpərəst *(adam)*; fantaziyaçı

**castle-building** ['ka:sl.bıldıŋ] *n* boş xəyallar, həyatakeçməz arzular, xəyala qapılma

**castle-guard** ['ka:slga:d] *n tar.* qəsr / qala gözətçisi

**castling** ['ka:slıŋ] *n şahm.* rokirokva, qala qurma; **queen's side ~** uzun rokirovka

**cast-off$^1$** ['ka:st'ɔf] *n* 1. atılmış, unudulmuş, kimsəsiz, tək-tənha *(adam)*; sürgün edilmiş /qovulmuş adam; 2. gərəksiz/lazımsız / dəyərsiz şey; 3. köhnə / cındır / nimdaş paltar; yemək artığı, qabaqdan qalan *(yemək)*; *As a child I used to wear my sister's cast-offs Uşaqlıqda mən bacımın köhnə-kürüş paltarlarını geyərdim*

**cast-off$^2$** ['ka:st'ɔf] *adj* 1. atılmış, tullanmış, rədd edilmiş; **~ lover** rədd edilmiş/olunmuş aşiq; 2. lazımsız, dəyərsiz, yaramaz, pis; **~ clothing** köhnə / cındır / nimdaş paltar, cır-cındır, köhnə-kürüş

**castor** ['ka:stə$^r$] *n* I 1. təkərcik, diyircək, çarx *(ağır mebelin asan hərəkət etdirilməsi üçün onların ayaqlarına bənd edilmiş kiçik çarx)*; 2. istiotqabı, bibərqabı, duzqabı, nəməkdan *(başı / qapağı deşik-deşik olan)*; **a set of ~s** sous/şirə üçün qab dəsti

**castor** ['ka:stə$^r$] *n* II 1. qunduz; 2. qunduz xəzi; 3. *toxuc.* kastor *(mahud növü)*; 4. *d.d.* qunduz dərisindən tikilmiş papaq

**castor oil** ['ka:stər'ɔıl] *n* gənəgərçək yağı *(işlətmə dərmanı)*

**castrate$^1$** [kæs'treıt] *n* 1. xədim; axta; 2. axtalanmış heyvan; buruq qoç; axta xoruz

**castrate$^2$** ['kæstreıt] *v* 1. axtalamaq; burmaq; 2. *məc.* məzmunsuzlaşdırmaq, məhrum etmək *(mənadan və s.)*; 3. kəsmək, qısaltmaq *(mətni)*

**castration** [kæs'treıʃn] *n* 1. axtalama, burma; 2. *məc.* məzmunsuzlaşdırma, məzmunsuzlaşdırılma, məhrum etmə *(ideyadan, məzmundan)*, saxtalaşdırma, saxtalaşdırılma; 3. qısaltma, ixtisar etmə/edilmə

**casual** ['kæʒjuəl] *adj* 1. təsadüfi, gözlənilməyən; **a ~ meeting** təsadüfi görüş; **~ discovery** gözlənilməyən / təsadüfi kəşf; **to talk of ~ things** təsadüfi şeylərdən danışmaq; *It was no casual reencounter Bu yeni görüş təsadüfi deyildi*; 2. qəsdsiz, qərəzsiz, qəsdən edilməyən; 3. qeyri-ciddi, ciddi olmayan; laqeyd, əhəmiyyətsiz; səthi; **~ attitude** qeyri-ciddi/səthi münasibət; **to be ~ towards success/praise** müvəffəqiyyətə/tərifə laqeyd olmaq; **to be ~ towards dress** geyimə laqeyd olmaq, necə gəldi geymək; **a ~ friendship** qeyri-ciddi / müvəqqəti dostluq; 4. *d.d.* yüngülxasiyyət, dəmdəməki, arsız, yelbeyin; etibarsız; şübhəli; **~ man** etibarsız adam; 5. təsadüfi, qeyri-müntəzəm; müvəqqəti; **~ labourer** günəmuzdçu, günəmuzd işləyən/daimi işi olmayan fəhlə; **~ worker** müvəqqəti işlə məşğul olan fəhlə; **~ reader** qeyri-müntəzəm oxucu; *John's a casual worker, he can't find a proper job anywhere Con müvəqqəti işlə məşğul olur, özünə daimi iş tapa bilmir*; 6. gündəlik, adi *(paltar haq.)*; 7. *tib.* bədbəxt hadisədən ziyan/zərər çəkən

**casually** ['kæʒjuəlı] *adv* 1. təsadüfi olaraq, təsadüfən, təsadüfi; bilmədən; 2. ötəri, sözgəlişi; yeri gəlmişkən; 3. qərəzsiz olaraq, qeyri-ixtiyari, bilməyərək, bilmədən, qəflətən, qəfildən, qərəzsiz; 4. səliqəsiz, başdansovma, saymazyana, diqqətsiz, bir təhər, başdansovdu

**casualness** ['kæʒjuəlnıs] *n* 1. təsadüfilik; 2. qərəzsizlik; 3. səliqəsizlik, saymamazlıq; diqqətsizlik, səthilik

**casualty$^1$** ['kæʒjuəltı] *n* 1. bədbəxt hadisə; qəza; xarab etmə, zədə, zərər; 2. *hərb.* sıradan çıxan; yaralı; zərbə almış; öldürülmüş, ölmüş, ölən *(adam)*; **to become a ~** yaralanmaq, öldürülmək; **to clear / to dispose off casualties** yaralıları döyüş meydanından təxriyə etmək/çıxartmaq; 3. *pl* canlı qüvvənin itirilməsi, insan itkisi, tələfat, itki; *The regiment suffered heavy casualties Alay ciddi/ağır itkiyə məruz qaldı, Alay ağır itki verdi*; 4. *pl hərb.* əzilmiş maşın; vurulmuş top, xarab edilmiş/vurulub əzilmiş texnika; *The tank became a casualty Tank vurulub sıradan çıxarılıdı*; 5. *hüq.* qarşısının alınması mümkün olmayan hadisə; 6. *tib.* yaralanmadan və ya qəzadan ölmə; **in case of ~** vaxtsız ölüm baş versə / olsa

**casualty$^2$** ['kæʒjuəltı] *adj*: **~ list** *hərb.* ölənlərin və yaralıların siyahısı; **~ report** *hərb.* döyüşdəki itki haqqında məlumat; **~ return** *hərb.* şəxsi heyətdə itki haqqında məlumat/svodka; **~ clearing** yaralanmış və zədələnmişlərin döyüş meydanından çıxarılması; **~ clearing point** *hərb.* təxliyə/köçürtmə məntəqəsi; **~ enquiry office** *hərb.* ölənlər, yaralılar və əsir düşənlər haqqında məlumat bürosu; **~ dog** *hərb.* sanitar it; **~ ward** təcili yardım palatası / otağı

**casuist** ['kæzjuist] *n* kazuist *(orta əsr sxolastikasında və ilahiyyatda ayrı-ayrı təsadüflərin ümumi ehkam şəklinə salınması)*

**casuistic** [.kæzju'istık] *adj* 1. kazuistik; 2. *məc.* mübahisədə zirək olan, yalan və şübhəli tezisləri sübut etməyi bacaran

**casuistry** ['kæzjuistrı] *n* kazuistika *(1. orta əsr sxolastikasında və ilahiyyatda ayrı-ayrı təsadüflərin ümumi ehkam şəklinə salınması; 2. tib. bir neçə xəstədə olan eyni xəstəliyin gedişi üzərində aparılan klinik müşahidələr)*

**cat** [kæt] *n* 1. pişik; **tom** ~ erkək pişik; 2. *zool.* pişik fəsiləsinə daxil olan heyvanlar; *(məs. pələng, şir və s.)*; **wild** ~ vəhşi pişik; 3. deyingən, bədxah qadın / arvad; sözgəzdirən, qeybətçi, dedi-qoduçu qadın / qız, acıdil, ətiacı *(adam)*; **old** ~ küpəgirən / cadugər qarı; kaftar; *Don't be a cat! Qeybət etmə! Dalca danışma!* 4. *jarq.* fahişə, qəhbə;

◊ **fat** ~ *amer.* pullu, varlı, dövlətli; **to send not a ~ for lard** ≅ qoyunu qurda tapşırmaq; **to bell the** ~ cəsarətlənmək, cəsarət etmək, cürətlənmək; özünü zərbə altında qoymaq; *A cat has nine lives Pişiyin yeddi canı var, Pişiyin canı bərk olar;* **a ~ with nine lives** canıbərk adam, yaşamağa qabil adam ≅ pişik kimi canıbərk adam; *The cat is out of the bag Pişik torbadan çıxıb ≅ Sirr açılıb / faş olub;* **to let the ~ out of the bag** pişiyi torbadan buraxmaq; ≅ sirri ağzından qaçırmaq; **to see how/which way the ~ jumps** ≅ hadisələrin necə cərəyan edəcəyini gözləmək, küləyin hansı tərəfdən əsəcəyini gözləmək; *When the cat's away, the mice will play ≅ Pişik olmayanda siçanlar bayram edir, ≅ Dərə xəlvət, tülkü bəy*

**cataclysm** ['kætəklızm] *n* kataklizm; kəskin/məhvedici /dağıdıcı hadisə *(təbiətdə, cəmiyyətdə)*

**cataclysmic** [,kætə'klızmık] *adj* 1. qəti, həlledici; sərt; 2. *fəls.* dağıdıcı, məhvedici

**catafalque** ['kætəfælk] *n* katafalk *(cənazə / ölü arabası)*

**catalepsy** ['kætəlepsı] *n* 1. *tib.* katalepsiya *(bədənin və ayrı-ayrı orqanların quruması və iradi hərəkət qabiliyyətinin itməsi)*; tetanus *(yoluxucu xəstəlik)*; 2. donma, donub/quruyub qalma, mat qalma *(təəccübdən, qorxudan)*; 3. qavrayış, qavrama, dərk etmə

**cataleptic** [,kætə'leptık] *adj* 1. *tib.* katalepsiya; 2. donmuş, donub qalmış, quruyub qalmış, mat qalmış *(təəccübdən, qorxudan və s.)*

**catalogue**[1] ['kætələg] *n* 1. kataloq *(müəyyən sistem üzrə tərtib edilmiş siyahı)*; **card** ~ kartoçka kataloqu; ~ **of places** coğrafi kataloq; ~ **by authors' names** müəllif kataloqu; 2. *amer.* sorğu / soraq / arayış kitabçası, salnamə; illik / ildə bir dəfə çıxan *(məcmuə, jurnal və s.)*; 3. preyskurant *(malların qiymət siyahısı)*; 4. siyahı, reyestr

**catalogue**[2] ['kætələg] *adj* 1. kataloq; ~ **card** kataloq kartoçkası; ~ **librarian** kataloqçu, kataloq tərtibçisi *(kitabxanada)*

**catalogue**[3] ['kætələg] *v* 1. kataloqa salmaq, kataloq düzəltmək; 2. preyskuranta / siyahıya daxil etmək; *Can you catalogue the furniture you sell and send me a copy of it Sən / Siz satdığın / satdığınız mebellərin siyahısını tutub onun surətini mənə göndərə bilərsənmi / bilərsinizmi?*; 3. bir-bir saymaq, qeyd etmək, qeydə almaq; **to ~ a woman's features** qadının xarici görünüşünü ətraflı/hərtərəfli təsvir etmək; *He catalogued all her faults O onun bütün günahlarını bir-bir saydı*

**cataloguer** ['kætə,ləgə^r] *n* kataloqçu, kataloq tərtibçisi / tərtib edən

**cataloguist** ['kætələgıst] *n* = **cataloguer**

**cataloguize** ['kætələgaız] *v* kataloqa salmaq, kataloq düzəltmək / tərtib etmək

**catalyses** [kə'tælısi:z] **catalysis** *isminin cəm formaSı*

**catalysis** [kə'tælısıs] *n (pl* **-es***)* *kim.* kataliz *(katalizatorların təsiri ilə kimyəvi reaksiyanın sürətlənməsi və ya yavaşıması)*

**catalyst** ['kætəlıst] *n kim.həm də məc.* katalizator *(kimyəvi reaksiyaları sürətləndirən və ya yavaşıdan maddə)*

**catalyzator** ['kætəlaızeıtə^r] *n* = **catalyst**

**catamaran** [,kætəmə'ræn] *n* 1. *dən.* katamaran *(gəmi növü)*; 2. deyingən/donquldanan adam; dalaşqan/davakar/cəncəl/deyingən/diliacı qadın

**catapult**[1] ['kætəpʌlt] *n* 1. katapulta 1) *tar.* mancanaq; 2) *qədimdə ox və ya daş atmaq üçün alət;* 3) *təyyarəni gəmidən havaya tullamaq üçün mexanizm, qurğu)*; 2. sapand, quşatan, roqatka

**catapult**[2] ['kætəpʌlt] *v* 1. atmaq, atılmaq, tullamaq, tullanmaq; *When I tried to catch the thief, he catapulted through the window and escaped Mən oğrunu tutmağa cəhd edərkən o, pəncərədən atıldı və aradan çıxdı*; 2. *av.* katapulta etmək; 3. sapand/roqatka atmaq; *The bad boy tried to catapult the old man's window Yaramaz oğlan qoca kişinin pəncərəsini quşatanla / roqatka ilə vurmağa çalışdı*

**cataract**[1] ['kætərækt] *n* 1. şəlalə *(böyük)*; 2. *coğ.* kandar *(çayın dibində köndələn daş təpə)*; 3. fəvvarə; axın *(göz yaşı və s. haq.)*; 4. *tib.* katarakta *(göz xəstəliyi)*

**cataract**[2] ['kætərækt] *v* şəlalə kimi axıb tökülmək

**cataracted** ['kætəræktıd] *adj* 1. *coğ.* kandarlı, astanalı, daşlı, təpəli *(çayın dibi haq.)*; 2. katarakta ilə xəstə *(göz haq.)*

**cataractous** [,kætə'ræktəs] *adj tib.* kataraktalı

**catarrh** [kə'ta:] *n* 1. *tib.* katar *(selikli qişanın iltihabı)*; 2. *d.d.* soyuqdəymə, tumov, zökəm; **epidemic** ~ qrip

**catarrhal** [kə'ta:rəl] *adj tib.* kataral

**catastrophe** [kə'tæstrəfı] *n* 1. qəza, bədbəxt hadisə; 2. faciə, müsibət, fəlakət, bəla; *The war was a terrible catastrophe Müharibə dəhşətli fəlakət /bəla idi*; 3. kataklizm, dağıdıcı/kəskin/məhvedici hadisə *(hadisələrin / proseslərin gedişində)*

◊ **nuclear** ~ 1) *fiz.* nüvənin parçalanması; 2) nüvə fəlakəti

**catastrophic** [,kætə'strɔfık] *adj* fəlakətli, faciəli, çox ağır



**catastrophically** [,kætə'strɔfıkəlı] *adv* fəlakətli / faciəli bir tərzdə / surətdə

**catatonia** [,kætə'tounıə] *n tib.* stupor *(bəzi ruhi xəstəliklər zamanı xəstənin hərəkət və danışmaq qabiliyyətini tamamilə itirdiyi hal)*

**catatony** ['kætətounı] *n tib.* = **catatonia**

**catatonic** [,kætə'tɔnık] *adj* katalepsiya xəstəliyinə tutulan, katalepsiya xəstəliyindən əziyyət çəkən

**catbird** ['kætbə:d] *n zool.* Amerika qaratoyuğu

**catcall**[1] ['kætkɔ:l] *n* fitəbasma, fıştırığabasma *(teatrda, idman yarışlarında və s.)*

**catcall**[2] ['kætkɔ:l] *v* fitə / fışdırığa basmaq

**catch**[1] [kætʃ] *n* 1. tutma, tutulma; yaxalama, yaxalanma; ələ keçmə, ələ keçirilmə; zəbt / işğal / istila etmə; 2. ov, balıq ovu; birdəfəyə tutulan balığın miqdarı; əldə etmə, axtarıb tapma; **a fine ~ of fish** yaxşı balıq ovu; **to be on the ~ for a husband** *arx.* ər axtarmaq; *Her husband was a good catch. They say he has got a fortune in the bank O, əlinə pullu ər keçirmişdi. Deyirlər, onun bankda kalan var-dövləti var;* 3. *d.d.* biclik, tələ, hiylə, kələk, fənd; *There must be a catch somewhere Burada nə isə bir kələk/hiylə var; What's the catch in this offer? Bu təklifdə nə hiylə / kələk var? That's the catch Bütün kələk / hiylə bax bundadır; That house is very cheap: there must be a catch somewhere Bu ev çox ucuz satılır: burada bir kələk /hiylə olmalıdır;* 4. ani dayanma *(nəfəs almada)*, ani olaraq səsini itirmə; **with a ~ in his voice** səsi kəsilə-kəsilə; **to speak with a ~ in *one's* voice** səsi kəsilə-kəsilə danışmaq; 5. rəzə, siyirmə; *The catch on this door seems to be broken. It won't open Görünür, bu qapının rəzəsi qırılıb. Açılmır;* 6. top-top oyunu *(əsasən uşaqların oyunu)*

**catch**[2] [kætʃ] *v (pt, pp* **caught***)* 1. tutmaq, yaxalamaq, ələ keçirmək; **to ~ *smb.* red-handed / in the act** bir kəsi cinayət başında tutmaq / yaxalamaq; *I caught him at it Mən onu cinayət başında tutdum*; **to ~ *smb.* napping** bir kəsi qəfildən / qəflətən / gözlənilmədən yaxalamaq; **to ~ in a word** sözdə tutmaq; *The policeman caught the thief Polis oğrunu tutdu*; 2. düşmək; **to be caught in the rain** yağışa düşmək; *A rat was caught in the trap Tələyə bir siçovul düşüb; We were caught in a snow-storm Biz qar tufanına düşdük*; 3. istifadə etmək; **to ~ an opportunity** imkandan istifadə etmək; 4. başa düşmək; *I don't catch your meaning Mən sizi başa düşmürəm*; 5. çatmaq, yetişmək, qovub çatmaq; **to ~ a horse near the winning-post** ata finiş dirəyinin yaxınlığında çatmaq; 6. ilişdirmək; toxunmaq; əzmək; ilişmək; **to ~ *one's* finger in the door** barmağını qapının arasında qoymaq; *Her dress caught on a nail Onun paltarı mismara ilişdi;* 7. düşmək, dəymək; *The blow caught him in the abdomen Zərbə onun qarnına dəydi;* 8. xəstələnmək, yoluxmaq, tutmaq *(xəstəlik və s.)*; **to ~ scarlet fever** skarlatinlə yoluxmaq; **to ~ a chill/(a) cold** soyuqlamaq, özünü soyuğa vermək, soyuq dəymək; *You will catch (a) cold if you don't put a coat on Sən / Siz palto geyinməsən / geyinməsəniz sənə / sizə soyuq dəyəcək;* **to ~ *one's* death of cold** soyuqlamadan ölmək; 9. çatmaq, yetişmək; **to ~ the train** qatara çatmaq; *We had to drive very quickly in order to catch the train Qatara çatmaq üçün biz maşını çox tez sürməli olduq;* 10. gözünə dəymək; **to ~ sight / a glimpse / a glance of *smth.*** bir şeyi ani görmək; *I caught sight / a glimpse / a glance of her in the crowd O, izdihamın içində bir an gözümə dəydi*; 11. cəlb etmək, çəkmək *(diqqəti və s.)*; *Bright colours catch a baby's eye Parlaq rənglər körpəni cəlb edir / körpənin diqqətini çəkir; The fact caught her attention Dəlil onun diqqətini cəlb etdi;* 12. bağlanmaq *(rəzə, cəftə və s. haq)*; *The lock won't catch Qıfıl bağlanmır;* **to ~ at** 1) yapışmaq, bərk-bərk tutmaq; 2) əmma qoymaq, irad tutmaq; *He catches at everything O hər şeyə əmma qoyur / irad tutur;* **to ~ away** oğurlamaq, xəlvəti götürmək, çırpışdırmaq; **to ~ out** aşkar etmək, üstünü açmaq, müəyyən etmək; tapmaq; *I'll catch him out one of these days Mən bu günlərin birində onu tapacam;* **to ~ up** 1) qaldırmaq, qapmaq, götürmək, qamarlamaq; *He caught up his hat and rushed out O, papağını götürdü və qaçmağa üz qoydu;* 2) götürmək, istifadə etmək *(yeni fikri, şüarı və s.)*; 3) çatmaq; **to ~ up and surpass** çatmaq və ötüb keçmək; **to ~ up with *smb.*** bir kəsə çatmaq / yetişmək; *I'll soon catch you up / catch up with you Mən tezliklə sənə / sizə çatacam;* 4) kəsmək *(natiqin nitqini)*; sual verməklə, qışqırmaqla çıxışçını çaşdırmaq; 5) qaldırmaq *(bayraq və s.)*; 6) irad tutmaq; *Don't catch up every remark I make Mənim hər sözümə irad tutma / tutmayın*;

◊ **to ~ it** qulaqburması almaq; *I caught it Mən qulaqburması aldım;* **to ~ *one's* foot** 1) büdrəmək, ayağı dolaşmaq; 2) *məc.* çaşmaq, çaşıb qalmaq, duruxmaq; **to ~ fire** yanmaq, od tutmaq, alovlanmaq; **to ~ *one's* breath** 1) nəfəsini saxlamaq; 2) sakit olmaq *(tövşükdən)*, rahat nəfəs almağa başlamaq; **to ~ hold of *smth.*** bir şeydən yapışmaq; *A drowning man will catch at a straw at. söz. Suda boğulan adam saman çöpündən yapışar*

**catcher** ['kætʃə^r] *n* 1. tutan, tutub saxlayan; 2. *tex.* məhdudlaşdırıcı; 3. *tex.* yağtutan *(cihaz)*

**catching** ['kætʃıŋ] *adj* 1. yoluxucu, yoluxma, keçici; *Yawning is catching Əsnəmək keçicidir;* 2. cəlbedən, cazibədar, cazibəli, məlahətli; 3. dəyişkən, qeyri-sabit *(hava haq.)*

**catchy** ['kætʃı] *adj d.d.* 1. nəzəri cəlb edən, nəzərə çarpan; cazibədar, cazibəli; 2. asan yaddaqalan *(melodiya və s.)*; 3. aldadıcı, etibarsız; çox bic /hiyləgər/fəndgir; 4. coşğun, şiddətli *(külək haq.)*
**catechism** ['kætıkızm] *n* 1. *kils.* katexizis *(xristianların sual-cavab şəklində olan şəriət kitabı)*; 2. bir sıra sual və cavab; sorğu-sual etmə, dindirmə, istintaq aparma, istintaq; **to put** *smb.* **through his** ~ yalvarıb-yaxarıb bir şeyi bir kəsdən ətraflı olaraq öyrənmək; 3. öyüd, nəsihət; nəsihət / öyüd vermə
**catechize, -ise** ['kætıkaız] *v* 1. sual-cavab formasında şərh/izah etmək; 2. dindirmək, sorğu-sual etmək/aparmaq, soruşub bilmək/öyrənmək; 3. *kils.* öyüd/nəsihət/öyüd-nəsihət vermək; düz yola çağırmaq; öyrətmək; katexizisi təlim etmək/öyrətmək
**categoric** [,kætı'gɔrık] *adj* = **categorical**
**categorical** [,kætı'gɔrıkəl] *adj* 1. qəti surətdə /olaraq; şərtsiz, danışıqsız; aydın; ~ **assertions** qəti / şərtsiz təsdiq etmə / təsdiqləmə; ~ **denial** qəti surətdə/olaraq imtina; ~ **answer** aydın / qəti cavab; *One should never make a categorical statement without being sure of one's facts Faktlara əmin olmadan qəti hökm vermək olmaz;* 2. *fəls.* qəti, şərtsiz *(hökm haq.)*
**categoricalness** [,kætı'gɔrıkəlnıs] *n* qətilik, şərtsizlik
**categorize** ['kætıgəraız] *v* kateqoriyalar üzrə müəyyənləşdirmək, təsnif etmək, kateqoriyanı müəyyənləşdirmək
**category** ['kætıgərı] *n* 1. kateqoriya; sinif; dərəcə; 2. *fəls.* kateqoriya; 3. idman dərəcəsi; **weight** ~ çəki dərəcəsi *(boksda, güləşdə)*
**cater**[1] ['keıtə'] *n* ictimai və ya xüsusi qonaqlıqları yemək və içməklə təmin edən şəxs və ya firma
**cater**[2] ['keıtə'] *v* 1. azuqə/ərzaq göndərmək /tədarük etmək, ərzaqla / azuqə ilə təmin etmək; 2. **(for)** xidmət etmək *(teatrda, restoranda və s.)*; **to ~ for the best public** seçmə/imtiyazlı adamlara xidmət etmək; **to ~ for weddings** toylara xidmət etmək; *Who is catering at your daughter's wedding? Sənin/Sizin qızının/qızınızın toyunda kim xidmət edəcək?*; 3. **(for)** yedirtmək, qidalandırmaq; 4. ehtiyac zamanı kömək etmək; saxlamaq; 5. **(to)** razı salmaq, yaramaq, qane etmək, qane etməyə cəhd göstərmək / çalışmaq; **to ~ to the public demand** camaatın tələbini ödəmək, camaatın tələbini təmin etmək
**cateran** ['kætərən] *n* quldur, pirat, qaçaq
**catering** ['keıtərıŋ] *n* 1. ərzaq /azuqə tədarükü; 2. toya, qonaqlığa və s. xidmət göstərmə
**caterpillar** ['kætəpılə'] *n* 1. *zool.* tırtıl *(kəpənək qurdu)*; 2. *məc.* qaniçən, qansoran, zəli; parazit, tüfeyli; 3. *tex.* *traktorun, tankın və s. çarxlarına keçirilən enli zəncir*; 4. tırtıllı traktor
**caterwaul**[1] ['kætəwɔ:l] *n d.d.* "pişik" musiqisi, "pişik" konserti
**caterwaul**[2] ['kætəwɔ:l] *v* 1. qışqırmaq *(pişik haq.)*, pişik kimi qışqırmaq; 2. pişik kimi hay-küy salmaq; 3. ahəngsiz çalmaq *(orkestr haq.)*; qulaq deşmək/incitmək *(musiqi haq.)*; 4. cinsi həvəs/ehtiras vəziyyətində olmaq; 5. arvad /qadın dalınca düşmək
**catgut** ['kætgʌt] *n* 1. ketqut *(qoyun və ya keçi bağırsağından hazırlanan sap; bağırsaqdan hazırlanan sim (musiqi alətlərində işlədilən)*; 2. skripka; *top.i* simli musiqi alətləri
**cathartic**[1] [kə'θa:tık] *n tib.* işlətmə dərmanı
**cathartic**[2] [kə'θa:tık] *adj* 1. *tib.* işlətmə; 2. *məc.* təmizləyən, təmizləyici, saflaşdırıcı
**cathedra** [kə'θı:drə] *n* 1. kafedra; 2. *kils.* kilsədə keşişin taxtı; 3. yüksək vəzifə / mənsəb; 4. yepiskop *(baş keşiş)* rütbəsi
**cathedral** [kə'θı:drəl] *n kils.* baş kilsə, came; ~ **of science** elm məbədi
**catheter** ['kæθıtə'] *n tib.* kateter *(dərman yeritmək, yumaq və ya boşaltmaq üçün bədən boşluqlarına və ya kanallarına yeridilən boru, zond)*; **a urinary** ~ sidik kateteri
**catheterize, -ise** ['kæθıtəraız] *v tib.* kateter salmaq / yeritmək
**cathodal** ['kæθədəl] *adj fiz.* katod; ~ **lamp** katod lampası
**cathode**[1] ['kæθoud] *n fiz.* katod
**cathode**[2] ['kæθoud] *adj* katod; ~ **beam** katod şüası; ~ **stream** katoddan çıxan elektron axını
**cathodic** [kə'θɔdık] *adj fiz.* = **cathodal**
**cat-hole** ['kæthoul] *n* 1. pişik üçün deşik / baca *(qapıda)*; 2. *məc.* balaca deşik / baca
**Catholic**[1] ['kæθəlık] *n kils.* 1. katolik; 2. katolik dininə mənsub olan adam/şəxs; *Is he a catholic or a protestant? O, katolikdir, yoxsa protestant?*
**Catholic**[2] ['kæθəlık] *adj kils.* 1. katolik; ~ **school** katolik məktəbi; ~ **children** katolik uşaqlar; 2. ümumdünya; ellik, ümumi; ~ **church** ümumdünya kilsəsi; ümumi kilsə; 3. apostol; ortodoksal, ortodoks *(öz məsləkində sabit və ardıcıl olan)*
**catholic** ['kæθəlık] *adj* 1. ümumdünya, dünya; ~ **war** dünya/ümumdünya müharibəsi; ~ **humanity** bütün bəşəriyyət/insanlıq; 2. geniş, hərtərəfli; hər şeydən xəbərdar, hər şeyi əhatə edən; **a man of ~ taste** geniş maraqları olan adam; ~ **vocabulary** zəngin söz ehtiyatı; 3. genişdüşünən; azadfikirli, azaddüşünən; liberal
**catholically** [kə'θɔlıkəlı] *adj* geniş, hərtərəfli; ~ **minded person** hərtərəfli/geniş biliyə malik olan şəxs
**Catholically** [kə'θɔlıkəlı] *adv* katolikcəsinə, katolik kimi
**catholicate** [kə'θɔlıkeıt] *n kils.* katolikos rütbəsi/mənsəbi *(erməni kilsəsində başçı)*
**Catholicism** [kə'θɔlısızm] *n kils.* 1. katolisizm *(katolik dini)*; 2. xeyirxah katolikə yaraşan hərəkət



**Catholicity** [,kæθə'lısıtı] *n* 1. katolik kilsəsinin təliminə müvafiqlik / uyğunluq; 2. Roma katolik kilsəsi; 3. katolisizm, katolik kilsəsinin təlimi
**catholicity** [,kæθə'lısıtı] *n* 1. hərtərəflilik, hərcəhətlilik, genişlik *(maraqlar və s.)*; 2. ümumilik; universallıq; 3. liberallıq, liberalizm; azadfikirlilik
**Catholicize, -ise** [kə'θɔlısaız] *v* I *kils.* katolik dinini qəbul etmək, katolik olmaq
**catholicize, -ise** [kə'θɔlısaız] *v* genişləndirmək, artırmaq; genəltmək, enlətmək, ümumi xarakter vermək, ümumiləşdirmək
**catkin** ['kætkın] *v bot.* salxım *(adət. söyüd və ya tozağacında)*
**cat-like** ['kætlaık] *adj* pişiyəoxşar, pişiyəbənzər, pişik kimi
**cat-nap** ['kætnæp] *n* pişik yuxusu, qısa yuxu, mürgü *(kresloda və s.)*
**cat-sleep** ['kætsli:p] *n* 1. arabir yatma; 2. = **cat-nap**
**cat's-eye** ['kætsaı] *n* 1. pişik gözü *(magistral yolda maşın işığı düşərkən parıldayan balaca işarə)*; 2. qiymətli daş
**cat's paw** ['kætspɔ:] *n* 1. bir kəsin əlində silah/alət olma; **to make a ~ out of** *smb.* bir kəsi əlində silah etmək, bir kəsə çirkin iş görməyi tapşırmaq; ≅ ilanı Seyid Əhməd əliylə tutmaq 2. xəfif sahil küləyi
**cat's-tail** ['kætsteıl] *n* 1. *bot.* su qamışı; 2. qorjet *(qadınların boynuna saldıqları ensiz xəz)*
**cat's-tail grass** ['kætsteıl'gra:s] *n bot.* pişikquyruğu
**cattish** ['kætıʃ] *adj* 1. hirsli, acıqlı, qəzəbli; kinli; acı, zəhərli; 2. bic, fəndgir, hiyləgər, kələkbaz, xain, məkrli; qılığagirən
**cattle**[1] ['kætl] *n (cəmdə dəyişmir, özündən sonra fel təkdə və cəmdə işlədilir)* 1. iribuynuzlu mal, qaramal *(xüs. öküz, inək)*; **ten** ~ on iribuynuzlu mal / mal-qara; **one head of ~** bir baş inək/öküz; **black** ~ *arx* ətlik mal-qara; **small** ~ xırdabuynuzlu mal *(qoyun, keçi)*; **pedigree** ~ cins mal-qara; ~ **on the hoof** ərzaq üçün mal-qara naxırı; *My uncle has 20 (head of) cattle on his farm Mənim dayımın/əmimin fermasında 20 baş mal-qarası var;* 2. kiçikbuynuzlu heyvan, həm də at, donuz; 3. *arx.* heyvan, yaramaz, əclaf *(insan haq.)*; 4. parazit *(həşərat haq.: bit, birə, gənə, taxtabiti və s.)*
**cattle**[2] ['kætl] *adj* qaramal; ~ **farm** qaramal/heyvandarlıq ferması; ~ **management** qaramal saxlama; ~ **house** pəyə, tövlə, mal damı; inək damı; pəyə; ~ **box/truck** qaramal daşımaq üçün vaqon/maşın; ~ **farmer** malabaxan, qaramal fermasının sahibi; ~ **dealer** mal-qara alverçisi
**cattle-crush** ['kætlkrʌʃ] *n k.t.* heyvanların buynuzunu kəsmək üçün dəzgah
**cattle-dealer** ['kætl,di:lə'] *n* mal-qara alverçisi, mal-qara saxlayan
**cattle-feeder** ['kætl,fi:də'] *n* yemverən maşın *(heyvanlara)*
**cattle-lifter** ['kætl,lıftə'] *n k.t.* malotaran, naxırçı
**cattleman** ['kætlmən] *n (pl* **-men** [mən]) 1. naxırçı, çoban; mala baxan, mal-qaraya baxan; 2. *amer.* maldar, maldarlıq mütəxəssisi; **wealthy** ~ dövlətli/zəngin maldar; böyük/iri maldarlıq təsərrüfatı sahibi
**cattle-plague** ['kætlpleıg] *n bayt.* heyvan / malqara taunu
**cattle-ranch** ['kætlra:ntʃ] *n* heyvandarlıq ferması / təsərrüfatı
**cattle-range** ['kætlreındʒ] *n* = **cattle-run**
**cattle-run** ['kætlrʌn] *n k.t.* böyük/geniş örüş, otlaq
**cattle-show** ['kætlʃou] *n* mal-qara sərgisi
**catty** ['kætı] *adj* = **cattish**
**Caucasian**[1] [kɔ:'keızjən] *n* 1. qafqazlı, Qafqaz sakini, Qafqazda doğulmuş adam; **the ~s** *top.i* qafqazlılar; 2. Qafqaz irqindən olan adam
**Caucasian**[2] [kɔ:'keızjən] *adj* 1. Qafqaz, Qafqaza /qafqazlılara aid olan; 2. Qafqaz irqinə aid olan; ~ **goat** dağkeçisi; ~ **milk** qatıq
**caucus** ['kɔ:kəs] *n* 1. *amer.* namizəd irəli sürmək üçün partiya rəhbərlərinin gizli / xəlvəti iclası; 2. konqresin hər-hansı fraksiyasının gizli iclası; 3. rəhbər işçilərin məhdud tərkibi; 4. *amer.* partiya tərəfdarlarının seçkiqabağı mitinqi
**cauliflower** ['kɔ:lı,flauə'] *n bot.* gülkələm
**caliform** ['kɔ:lıfɔ:m] *adj* saplağabənzər, saplağaoxşar
**cauline** ['kɔ:laın] *adj bot.* gövdəli, saplaqlı
**causal** ['kɔ:zəl] *adj* 1. səbəbiyyət; ~ **connection** səbəbiyyət əlaqəsi; **the ~ connection between events** hadisələr arasında səbəbiyyət əlaqəsi; 2. təsadüfi; **a ~ meeting** təsadüfi görüş; ~ **labourer** təsadüfi işlə məşğul olan fəhlə; 3. *qram.* səbəb; ~ **clause** səbəb budaq cümləsi; *Casual clauses usually begin with the word "because" Səbəb budaq cümlələri adətən "because" sözü ilə başlanır;* 4. səbəb olan
**causality**[1] [kɔ:'zælıtı] *n fəls.* 1. səbəb, səbəbiyyət; səbəbiyyət əlaqəsi; *The law of causality says that all effect have a cause Səbəbiyyət qanununa görə bütün hadisələrin səbəbi olur*
**causality**[2] [kɔ:'zælıtı] *adj:* ~ **list** ölən və yaralıların siyahısı; ~ **ward** təcili yardım otağı / palatası
**causation** [kɔ:'zeıʃn] *n* 1. səbəb olma; 2. *tib.* etiologiya *(xəstəliyin səbəbləri haq. elm)*; ~ **of disease** xəstəliyin səbəbləri, xəstəliyi törədən səbəblər; 3. *fəls.* səbəbiyyət, səbəb; 4. = **causality**[1]
**causative**[1] ['kɔ:zətıv] *n qram.* kauzativ, icbar növ
**causative**[2] ['kɔ:zətıv] *adj* 1. *fəls.* səbəbiyyət; 2. səbəb, kauzativ; ~ **verb** səbəb feli; ~ **agent** törədici *(xəstəlik və s.)*; ~ **organism** xəstəliktörədən orqanizm; 3. *qram.* icbar, kauzativ

**causativity** [ˌkɔ:zəˈtɪvɪtɪ] *n fəls.* səbəbiyyət; səbəblik, hadisələr arasında səbəb əlaqəsi

**cause**[1] [kɔ:z] *n* 1. səbəb, əsas; ~ **and effect** səbəb və nəticə; **prime** ~ əsas/baş/başlıca səbəb; **first ~ of all ~s** səbəblərin səbəbi; ~ **of death** ölümün səbəbi; **the ~s of war** müharibənin səbəbləri; **to stay away from school without good ~** üzürlü səbəb olmadan dərs buraxmaq; *What was the cause of the fire? Yanğına səbəb nə idi?; He is the cause of all our troubles Bizim bütün müsibətlərimizin səbəbi odur; There is no cause for anxiety/for despair Narahatlığa /Ümidsizliyə səbəb yoxdur; Don't complain without good cause Tutarlı səbəb olmadan şikayət etmə /etməyin;* 2. **(for, of)** motiv, bəhanə, səbəb; **just** ~ inandırıcı motiv, tam əsas; **a ~ of action** hərəkət üçün əsas/motiv; **without** ~ əsassız olaraq; ~ **for divorce** boşanmaq üçün əsas/səbəb; ~ **for rejoicing** şadlıq/sevinc üçün səbəb; 3. iş; ümumi iş; **the ~ of peace** sülh işi; **the ~ of the workers** fəhlə sinfinin ümumi işi; **in the ~ of science** elm naminə / xatirinə; *He died for the Cause O, ümumi iş naminə həlak oldu;* **good** ~ ədalətli / yaxşı iş; **to work in a good ~** ədalətli iş uğrunda mübarizə aparmaq; **lost** ~ ümidsiz / uduzulmuş iş; **to fight in the ~ of justice** haqq/ədalət işi uğrunda mübarizə aparmaq; **to fight in the ~ of the oppressed** məzlumların tərəfində mübarizə aparmaq; 4. *hüq.* məhkəmə işi, proses; **to plead a ~** məhkəmə işi aparmaq; **to gain** *one's* ~ prosesi udmaq *(məhkəmədə);* **to show** ~ əsas göstərmək; ~ **of action** işi qaldırmaq üçün əsas; 5. *arx.* xəstəlik, naxoşluq, azar

**cause**[2] [kɔ:z] *v* 1. əsas /səbəb olmaq; *What caused his death? Onun ölümünə səbəb nə oldu? What causes the tides? Qabarmaya nə səbəb olur?;* 2. məcbur etmək, oyatmaq; əldə etmək, nail olmaq; *He caused me to go O məni getməyə məcbur etdi;* **to ~ smb. to be informed** bir kəsə məlumat vermək, bir kəsi məlumatlandırmaq; *He caused the letter to be sent Məktub onun əmrinə əsasən göndərildi*

**causeless** [ˈkɔ:zlɪs] *adj* səbəbsiz, əsassız, əsası / səbəbi olmayan

**causelessly** [ˈkɔ:zlɪslɪ] *adv* səbəbsiz, səbəbsiz olaraq, səbəb olmadan

**cause-list** [ˈkɔ:zlɪst] *n hüq.* dinləniləcək / baxılacaq işlərin siyahısı

**causeway**[1] [ˈkɔ:zweɪ] *n* 1. döşəmə, döşənmiş yol; küçənin döşənmiş hissəsi; 2. şax/çırpı döşənək *(bataqlıq və ya palçıq yerlərə döşənən)*; 3. kiçik damba/torpaq bənd

**causeway**[2] [ˈkɔ:zweɪ] *v* 1. döşəmək *(daşla və s.);* 2. bənd / damba tikmək

**caustic**[1] [ˈkɔ:stɪk] *n* 1. yeyici/aşındırıcı maddə; **common / lunar** ~ *kim.* lyapis *(cəhənnəm daşı, gümüş nitrat);* 2. acılıq, zəhərlilik, zəhər; acıdillilik, acı istehza, kinayə; **full of ~** ədavətli, ədavətlə / kinlə dolu, zəhərli

**caustic**[2] [ˈkɔ:stɪk] *adj* 1. *kim.* yeyici, aşındırıcı; yandırıcı, kaustik; ~ **lime** söndürülməmiş əhəng /kirəc; ~ **soda** natrium hidroksid, kaustik soda; 2. acı, zəhərli, kinayəli, istehzalı; ~ **tongue** acı /zəhərli dil; ~ **remarks** istehzalı/kinayəli iradlar

**caustically** [ˈkɔ:stɪkəlɪ] *adv* acı, acı-acı, istehza ilə, kinayə ilə; **to smile ~** istehza ilə gülümsəmək

**causticity** [kɔ:sˈtɪsɪtɪ] *n* 1. yeyicilik, aşındırıcılıq; 2. acılıq, acıdillilik, zəhərlilik; acı istehza

**cauterization, -isation** [ˌkɔ:təraɪˈzeɪʃn] *n tib.* yandırma, yandırılma; dağlama *(müalicə məqsədilə)*

**cauterize, -ise** [ˈkɔ:təraɪz] *v* 1. *tib.* yandırmaq, dağlamaq; 2. *məc.* damğalamaq, damğa basmaq; 3. hissiyatsız etmək, keyləşdirmək; kütləşdirmək; **to ~ conscience** vicdanı susdurmaq / kütləşdirmək

**cautery** [ˈkɔ:tərɪ] *n tib.* 1. yandırma, dağlama, dağlanma; 2. yandırıcı maddə/vasitə; 3. termokauter *(yandırmaq üçün alət)*

**caution**[1] [ˈkɔ:ʃn] *n* 1. ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq; **to do** *smth.* **with great ~** bir şeyi çox ehtiyatla etmək; **to use ~** ehtiyatlılıq / ehtiyat etmək; 2. tədbir, ehtiyat tədbiri; tədbirlilik; 3. xəbərdarlıq; saqındırma, çəkindirmə; xəbərdarlıq etmə; *Caution! Ehtiyatlı olun! Xəbərdar! The judge gave the defendant a caution Hakim müttəhimə xəbərdarlıq etdi;* 4. *hüq.* girov, zəmanət, zaminlik; **to find ~ for smb.** bir kəsə zamin olmaq / durmaq; 5. qəribə şey, qeyri-adi əhvalat

**caution**[2] [ˈkɔ:ʃn] *adj* xəbərdarlıq; ~ **signal** xəbərdarlıq siqnalı, sarı işıq; ~ **board** təhlükəni xəbər verən lövhə / plakat

**caution**[3] [ˈkɔ:ʃn] *v* xəbərdar etmək, xəbər vermək; saqındırmaq, qabağını almaq, çəkindirmək; *I cautioned him against being late Mən onu xəbərdar etdim ki, gecikmək olmaz;* **to ~ against unwarranted expectations** 1) əsassız ümidlər haqqında xəbərdarlıq etmək; 2) *hüq.* tutularkən həbs olunana xəbərdarlıq etmək

**cautionary** [ˈkɔ:ʃnərɪ] *adj* 1. xəbərdaredici, saqındırıcı, qoruyucu; xəbər verən, qarşısını/önünü alan, ehtiyat; ~ **example** ibrətamiz/ibrətli misal; ~ **tales** ibrətamiz əhvalatlar; ~ **advice** saqındırıcı məsləhət/öyüd/nəsihət; 2. *arx.* ehtiyatlı, ehmallı, üsullu

**cautioner** [ˈkɔ:ʃənəʳ] *n hüq.* zamin, zəmanətçi, zamin olan adam

**caution-money** [ˈkɔ:ʃnˌmʌnɪ] *n* girov qoyulan pul

**cautious** [ˈkɔ:ʃəs] *adj* ehtiyatlı, ehmallı, üsullu; ehtiyatkar; tədbirli, işinin dalını-qabağını bilən; **a ~ man** ehtiyatlı/tədbirli adam; ~ **policy** ehtiyatlı/tədbirli siyasət; **a ~ choice of words** sözlərin ehtiyatla/dəqiqliklə seçilməsi; ~ **in** *one's* **movement** hərəkətində ehmallı/ehtiyatlı olma; **to be ~ how you step** atdığın addımda ehtiyatlı olmaq; ~ **not to disturb the sleepers** yatanları oyatmamaq/narahat etməmək üçün ehtiyatla hərəkət edən; *Be cautious of her! d.d. Ondan ehtiyatlı ol!/ olun! Ondan özünüzü gözlə!/gözləyin!*



**cavalcade** [ˌkævəlˈkeɪd] *n* 1. kavalkada, dəstə *(gəzməyə çıxmış atlılar dəstəsi);* 2. təntənəli nümayiş, kütləvi yeriş; təntənəli mərasim; 3. qatar, cərgə, sıra; gediş, inkişaf *(hadisə haq.);* ~ **of history** tarixin gedişi / inkişafı, tarixi hadisələrin silsiləsi; ~ **of fashion** dəblərin birinin digərini əvəz etməsi

**cavalier**[1] [ˌkævəˈlɪəʳ] *n* 1. atlı; 2. *tar.* atlı əsgər; cəngavər

**cavalier**[2] [ˌkævəˈlɪəʳ] *adj* 1. ədəbsiz, nəzakətsiz, utanmaz, saymaz; sərbəst; ~ **treatment** sərbəst rəftar; ~ **manners** sərbəst davranış; 2. təkəbbürlü, lovğa, dikbaş, ötkəm; təşəxxüslü, iddialı, mütəkəbbir, başqalarına xor baxan; ~ **tone** təkəbbürlü / iddialı ton

**cavalier**[3] [ˌkævəˈlɪəʳ] *v* 1. kavaler *(qadını əyləndirən, onunla rəqs edən kişi)* olmaq; 2. müşayiət etmək *(qadını)*

**cavalry**[1] [ˈkævəlrɪ] *n* süvari qoşun / əsgər; yaxşı at sürən

**cavalry**[2] [ˈkævəlrɪ] *adj* süvari; atlı; ~ **soldier** süvari/atlı əsgər; ~ **sword** qılınc *(süvarilərin işlətdiyi)*

**cavalryman** [ˈkævəlrɪmən] *n (pl* **-men** [-mən]) süvari / atlı əsgər

**cavatina** [ˌkævəˈti:nə] *n mus.* kavatina *(operada qısa lirik ariya)*

**cave**[1] [keɪv] *n* 1. mağara, kaha, zağa; 2. boşluq; çuxur, oyuq, batıq, çala

**cave**[2] [keɪv] *v* 1. sıxmaq, sıxıb çıxartmaq; 2. qazmaq; eşələmək; dağıtmaq, uçurmaq; 3. uçmaq, uçurmaq; uçub dağılmaq/tökülmək; **to ~ in** 1) çökmək, uçub dağılmaq, uçmaq, sökülmək *(bina, suvaq və s.); The roof of the old house caved in during the storm Tufan zamanı köhnə evin damı uçub dağıldı; They caved in the roof of the house yesterday Onlar evin damını dünən uçurdular;* 2) təslim olmaq, geri durmaq, güzəşt etmək, güzəştə getmək; *When I argued he caved in and was silent Mən mübahisə etdikdə, o təslim oldu və sakitləşdi*

**cave**[3] [keɪv] *inter Ehtiyatlı ol / olun!*

**cave-dweller** [ˈkeɪvˌdweləʳ] *n* = **caveman**

**cave-man** [ˈkeɪvmæn] *n (pl* **-men** [-mən]) 1. troqlodit *(mağarada yaşayan ibtidai insan),* mağara adamı; 2. qaba/ kobud adam

**cavern** [ˈkævən] *n* 1. *şair.* mağara; 2. *tib.* kaverna *(xəstəlik prosesi nəticəsində bədən üzvü toxumalarının dağılması nəticəsində onda əmələ gəlmiş boşluq)*

**cavernous** [ˈkævənəs] *adj* 1. mağaralı, mağara ilə zəngin; çox mağara / kaha olan; zağalı, zağa çox olan; 2. mağaraya/zağaya oxşar olan, mağarayaoxşar, mağarayabənzər; 3. dərin və boğuq *(səs haq.)*

**caviar** [ˈkævɪa:ʳ] *n* kürü;
◊ ~ **to the general** ≅ eşşəyə zəfəran

**cavil**[1] [ˈkævɪl] *n* öcəşmə, sataşma, yersiz irad, bəhanə, qərəz

**cavil**[2] [ˈkævɪl] *v* 1. **(at, about)** irad tutmaq, günah axtarmaq; **to ~ about the arrangements** işin qoyuluşu haqqında narazılıq bildirmək; 2. əsassız etiraz irəli sürmək, süründürməçiliklə məşğul olmaq

**caviller** [ˈkævɪləʳ] *n* 1. böhtançı, iradçı, hər şeyə irad tutan adam, hər şeydən əmma çıxardan adam; 2. deyingən/daim donquldanan adam; 3. əngəlçi, süründürməçi, əngəl törədən adam; 4. fitnəçi, intriqaçı, fitnəkar, kələkbaz

**cavity** [ˈkævɪtɪ] *n* 1. çala, çökək, oyuq; çuxur, batıq; 2. boşluq; boş yer; **abdominal** ~ qarın boşluğu; **mouth** ~ ağız boşluğu; 3. deşik, oyuq *(dişdə);* **to fill cavities** oyuqlara plomb qoymaq *(dişdə)*

**cavort** [kəˈvɔ:t] *v amer d.d.* atılmaq, atlanmaq, hoppanmaq, tullanmaq, sıçramaq, atılıb-düşmək

**cavy** [ˈkeɪvɪ] *n zool.* hind donuzu

**caw**[1] [kɔ:] *n* qarıldama

**caw**[2] [kɔ:] *v* qarıldamaq, qır-qır etmək

**cawk**[1] [kɔ:k] *n* qarıldama; quş qışqırtısı

**cawk**[2] [kɔ:k] *v* qarıldamaq; qışqırmaq *(quş haq.)*

**cay** [keɪ, ki:] *n* 1. banka *(dənizin dibindəki hündürlüklər);* 2. rif *(sualtı qayalar)*

**cayenne** [keɪˈen] *n bot.* qırmızı istiot, bibər

**cayman** [ˈkeɪmən] *n zool.* alligator *(Amerika timsahı)*

**cease**[1] [si:s] *n* 1. *arx.* kəsmə, qurtarma, dayandırma, nəhayət vermə; 2. kəsilmə, qurtarılma, dayandırılma, nəhayət verilmə;
◊ **without ~** dayanmadan, durmadan, arasıkəsilmədən, daim, fasiləsiz olaraq; **to work without ~** dayanmadan/durmadan / arasıkəsilmədən işləmək

**cease**[2] [si:s] *v* 1. kəsmək, qurtarmaq, dayandırmaq, saxlamaq, nəhayət vermək; son qoymaq; **to ~** *one's* **efforts** cəhdini/ səyini dayandırmaq; **to ~ talking** danışığı dayandırmaq; *The snow never ceased falling Qar heç vaxt dayanmırdı; He ceased to go to school O, oxumağa son qoydu, O, məktəbə getmədi; She ceased driving a car O, maşın sürməyi dayandırdı;* ~ **fire / firing** *hərb.* atəşkəs, atəşi kəsmə / dayandırma; **to ~ to be** yox olmaq, varlığını dayandırmaq; 2. dayanmaq, kəsmək; *The rain has ceased Yağış kəsib / dayanıb*

**cease-fire** [ˈsi:sˌfaɪəʳ] *n* atəşkəs, atəşi dayandırma

**ceaseless** [ˈsi:slɪs] *adj* fasiləsiz, aramsız, dayanmayan, arasıkəsilmədən; arasıkəsilməyən; arasıkəsilməz; ~ **activity** fasiləsiz fəaliyyət; *Ceaseless enemy activity has forced us to leave*

that area *Düşmənin aramsız / fasiləsiz hərəkəti bizi o ərazini tərk etməyə məcbur etdi*

**ceaselessly** ['si:slıslı] *adv* arası kəsilmədən, aramsız, fasiləsiz olaraq, durmadan, daim, dalbadal; *She cried ceaselessly O, aramsız / fasiləsiz olaraq ağlayırdı; It was raining all day long ceaselessly Yağış bütün günü ara vermədən/aramsız / fasiləsiz olaraq yağırdı*

**cecils** ['seslz] *n pl aşp.* frikadel *(xırda küftəyəoxşar xörək)*

**cecity** ['si:sıtı] *n tib.* **1.** korluq; **2.** *məc.* avamlıq, cahillik, nadanlıq

**cedar**[1] ['si:də(r)] *n bot.* sidr, sidr ağacı

**cedar**[2] ['si:də(r)] *adj* sidr; ~ **nuts** sidr qozu / tumu; ~ **forest** sidr meşəsi

**cedar-bird** ['sı:dəbə:d] *n zool.* ardıc quşu

**cede** [sı:d] *v* **1.** vermək; təslim etmək *(qalanı, ərazini)*; **2.** təhvil vermək; güzəşt etmək, güzəştə getmək, vermək *(ərazini, hüququ və s.)*; *They ceded some of their rights Onlar bəzi hüquqlarını güzəştə getdilər*; **3.** güzəşt etmək *(mübahisədə)*, haqlı olduğunu etiraf etmək *(bir kəsin)*; **to ~ a point** fərz / güman etmək; *I cede the point Fərz edək ki, belədir*

**cee** [si:] *n* C, c *hərfinin adı*

**ceiling** ['si:lıŋ] *n* **1.** tavan; **high ~** hündür tavan; **low ~** alçaq tavan; **2.** maksimum, hədd, hüdud; sərhəd; **3.** *məc.* dondurma; **to put a ~ on conventional weapons** adi silahları dondurmaq; **4.** *av.* *təyyarənin praktik olaraq uçma hündürlüyü*;
◊ **to hit the ~** *jarq.* hirslənmək, qeyzlənmək, özündən çıxmaq, cin atına minmək

**ceilometer** [si:'lɔmıtə(r)] *n* buludların hündürlüyünü ölçmək üçün cihaz

**celadon** ['selədɔn] *n* **1.** açıq-yaşıl rəng; dəniz dalğasının rəngi; **2.** seladon *(Çin farfor növü)*; **3.** arvadbaz, şorgöz, arvad düşkünü

**celandine** ['seləndaın] *n bot.* **1.** dəmrovotu; **2.** balzamin, xınaçiçəyi

**celebrate** ['selıbreıt] *v* **1.** bayram etmək; bayram keçirtmək; təntənəli surətdə qeyd etmək *(ildönümünü və s.)*; şənlik/şadlıq etmək *(qələbə münasibətilə)*; **2.** məşhur etmək, şöhrətləndirmək, tərifləmək, mədh etmək; **to ~ a hero** qəhrəmanı tərifləmək/mədh etmək; **3.** məşhur olmaq; şöhrətlənmək; şöhrətləndirilmək, mədh edilmək; **4.** *arx.* təntənə ilə bildirmək / elan etmək; demək

**celebrated** ['selıbreıtıd] *adj* məşhur, şöhrətli, şöhrət/ad qazanmış, tanınmış; **a ~ painter** məşhur/şöhrətli rəssam; **to be ~** məşhur olmaq; *Venice is celebrated for its beautiful buildings Venesiya özünün gözəl tikililəri ilə məşhurdur*

**celebration** [ˌselı'breıʃn] *n* **1.** bayram etmə/ edilmə; **2.** təntənə, şadlıq, şənlik, bayram; **3.** şöhrətləndirmə, şöhrətlənmə; tərifləmə, mədh etmə; **4.** *arx.* məşhurluq, şöhrətlilik; şöhrət, şərəf

**celebrity** [sı'lebrıtı] *n* **1.** şöhrət, məşhurluq, ad, san; **2.** bayram etmə, şənlik, şadlıq, bayram

**celerity** [sı'lerıtı] *n* **1.** tezlik, yeyinlik, itilik; **with ~** tez, cəld, sürətlə, tələsik; **2.** *arx.* sürət

**celery** ['selərı] *n bot.* **1.** kərəviz; **2.** kərəviz gövdəsi/yarpağı/qıçası; *The cook put a stick of celery on everyone's plate Aşpaz hərənin boşqabına bir qıça kərəviz qoydu*

**celesta** [sı'lestə] *n mus.* çelesta *(metal lövhəciklərdən ibarət zərb musiqi aləti)*

**celestial**[1] [sı'lestjəl] *n* **1.** Allah, mələk; **2.** *arx.* göy imperiyasının sakini, çinli

**celestial**[2] [sı'lestjəl] *adj* **1.** göy; səma; **~ bodies** göy cisimləri; *The sun, the stars and the moon are celestial bodies Günəş, ulduzlar və ay göy cisimləridir*; **~ map** səmanın ulduzlar xəritəsi; **~ pole** *astr.* dünyanın qütbü; **~ blue** səma / göy rəngi; **2.** ilahi, göy; **~ bliss** cənnət səadəti / kefi / ləzzəti; **~ happiness** ilahi / fövqəladə xoşbəxtlik; **~ food** allahların azuqəsi;
◊ **Celestial Empire** *tar.* Səma / Göy İmperiyası *(Çin)*; **Celestial Emperor** *tar.* Səma oğlu, Çin imperatoru; **Celestial City** *din.* cənnət

**celibacy** ['selıbəsı] *n* **1.** subaylıq, nikahsızlıq; **2.** *kils.* nikahsızlıq, daimi subaylıq *(katolik ruhanilərdə)*; **3.** *zaraf.* subaylıq həyatı

**celibatarian**[1] [ˌselıbə'teərıən] *n* **1.** kəbinsizlik tərəfdarı; **2.** *zaraf.* möhkəm əqidəli subay kişi *(yəni subaylıqdan əl çəkməyən)*

**celibatarian**[2] [ˌselıbə'teərıən] *adj* kəbin əleyhinə olan, kəbinsizlik tərəfdarı

**celibate**[1] ['selıbıt] *n* **1.** nikahsızlığa söz verən *(adam)*; **2.** *zaraf.* etiqadlı subay kişi; **3.** *kils.* nikahsızlıq, daimi subaylıq *(katolik ruhanilərdə)*, kəbinsizlik; **4.** ərsiz arvad/qız

**celibate**[2] ['selıbıt] *adj* **1.** nikaha girməmiş, ərə getməmiş; **2.** subay; ərsiz; **3.** *kils.* nikahsızlığa söz verən

**celibate**[3] ['selıbıt] *v kils.* nikahsızlığa məcbur etmək, subay qalmağa vadar etmək

**cell** [sel] *n* **1.** kamera; bölmə, şöbə; seksiya; **2.** həbsxana kamerası; **condemned ~** ölümə məhkum olunanlar üçün kamera; **3.** hücrə; sovməə, monastır; **4.** *siya.* özək; **Communist ~** *tar.* kommunist özəyi; **5.** *biol.* hüceyrə; *Use your little grey cells d.d. Başını işlət, Bir az düşün / düşünün!*; **6.** *fiz.* element *(elektrik qüvvəsi hasil edən cihaz)*; **7.** fotoelement

**cellar**[1] ['selə(r)] *n* **1.** zirzəmi; **2.** anbar; çaxır anbarı; **to keep a good ~** yaxşı şərab/çaxır ehtiyatı olmaq; **3.** yol sandıqçası;
◊ **from ~ to garret** bütün evdə, evin hər yerində / tərəfində

**cellar**[2] ['selə(r)] *v* zirzəmidə/anbarda saxlamaq

**cellarage** ['selərıdʒ] *n* **1.** zirzəmilər; anbarlar; anbar tikililəri / binaları; **2.** zirzəmilərdə saxlama; **3.** zirzəmilərdə saxlama haqqı



**cellarer** ['selərə(r)] *n kils.* kelar *(monastır təsərrüfatına baxan rahib)*

**cellaress** ['selərıs] *n kils.* ana-kelar *(monastır təsərrüfatına baxan qadın)*

**cellaret** [ˌselə'ret] *n* bar *(ayaqüstü restoran)*

**cellophane** ['seləfeın] *n* sellofan;
◊ **wrapped in ~ 1)** əlçatmaz; möhkəm, ələ keçməz, alınmaz; çox təkəbbürlü/lovğa; **2)** dəymədüşər

**cellular** ['seljulə(r)] *adj* **1.** hüceyrəli, hüceyrə quruluşlu; **~ issue** *anat.* hüceyrə; **2.** göz-göz, dəlik-dəlik, deşik-deşik; torvarı, toraoxşar; **~ concrete** deşik-deşik / dəlik-dəlik beton; **~ radiator** *tex.* toraoxşar radiator; **3.** məsaməli, deşik-deşik; tor-tor; **~ rubber** məsaməli / deşik-deşik rezin; **~ shirt** tor köynək; *This cellular rock holds much water Bu məsaməli qaya çox su saxlayır*; **4.** seksiyalara bölünmüş, seksiya;
◊ **~ team** *harb.* ehtiyat taqımı/komandası

**Celt** [kelt] *n* kelt *(Qərbi Avropada yaşamış qədim xalqın adı)*; **the Celt** Keltlər

**Celtic**[1] ['keltik] *n* kelt dili

**Celtic**[2] ['keltik] *adj* kelt; **the ~ language** kelt dili

**cement**[1] [sı'ment] *n* **1.** sement; **2.** sementləyici maddə

**cement**[2] [sı'ment] *adj* sement; **~ mortar/grouting** sement məhlulu, sementlə hazırlanmış məhlul

**cement**[3] [sı'ment] *v* **1.** sementləmək, sementlə bərkitmək; **2.** qırılmaz əlaqələrlə möhkəmlətmək; möhkəm əlaqə yaratmaq; **to ~ a friendship** dostluğu möhkəmlətmək

**cementation** [ˌsi:men'teıʃn] *n* sementləmə, sementlə bərkitmə / möhkəmləndirmə

**cemetery** ['semıtrı] *n* qəbiristan

**cenotaph** ['senəta:f] *n* abidə; **the Cenotaph** birinci dünya müharibəsində həlak olanların xatirəsinə ucaldılmış abidə *(London şəhərində)*

**censor**[1] ['sensə(r)] *n* **1.** senzor *(mətbuat və ya səhnə əsərləri və s. üzərində nəzarət həyata keçirən şəxs)*; **2.** nəzarətçi, gözətçi, keşikçi, baxıcı *(kolleclərdə)*; **3.** kritikan, tənqidbaz *(hər bir şeydə eyib axtaran, hər bir şeyi tənqid edən adam)*; **4.** adətlərin / dəblərin nəzarətçisi

**censor**[2] ['sensə(r)] *v* **1.** senzor nəzarətindən keçirmək, senzuradan keçirmək; **2.** senzorun təklifi ilə dəyişdirmək və ya silmək

**censorial** [sen'sɔ:rıəl] *adj* senzor; senzura; senzora aid olan

**censorious** [sen'sɔ:rıəs] *adj* ciddi, zabitəli, tələbkar; ittiham etməyə meyilli; bəhanə axtaran, hər şeyə mız qoyan / irad tutan, bəhanəçi, öcəşkən; **~ remarks** ciddi / tənqidi iradlar; **~ people** ciddi / tələbkar / zabitəli adamlar; **to read with a ~ eye** tələbkarlıqla oxumaq *(mətni)*; **to be ~ of / upon** pisləmək, tənqid etmək; pis yanaşmaq

**censoriously** [sen'sɔ:rıəslı] *adv* tənqidi, tənqidi tərzdə / surətdə; öcəşkənliklə, öcəşkən bir tərzdə; ittihamedici bir tərzdə

**censoriousness** [sen'sɔ:rıəsnıs] *n* öcəşkənlik, bəhanə axtarma; ittiham etməyə meyllilik

**censorship** ['sensəʃıp] *n* **1.** senzura; **2.** senzor vəzifəsi, senzorluq

**censure**[1] ['senʃə(r)] *n* **1.** qınama, tənə, töhmət, danlaq, məzəmmət; *He received a public censure for his dishonourable behaviour Yaramaz hərəkətlərinə görə o, ictimai məzəmmətə məruz qaldı*; **2.** ciddi hökm/ittihamnamə; **vote of ~** etimadsızlıq rəyi; *The opposition failed to pass a vote of censure on the government Müxalifət hökumətə qarşı etimadsızlıq göstərmək barədə səsvermə keçirə bilmədi*; **3.** senzura *(mətbuatın, bədii əsərlərin və s.-nin nəzarət məqsədi ilə nəzərdən keçirilməsi; bu nəzarəti həyata keçirən dövlət idarəsi)*; **4.** *arx.* fikir, hökm, tənqidi qiymət; **5.** düzəliş, nəzərdən keçirmə və düzəliş *(mətn haq.)*

**censure**[2] ['senʃə(r)] *v* **1.** məzəmmətləmək, məzəmmət/töhmət etmək; danlamaq, pisləmək, tənə vurmaq, qınamaq; **2.** mühakimə/mülahizə yürütmək, fikir söyləmək, hökm/qiymət vermək; *Censure me in your wisdom Öz ağlına/ağlınıza müvafiq olaraq mənə qiymət ver / verin*

**census** ['sensəs] *n* **1.** siyahı; siyahıyaalma; **to take the ~** siyahıya almaq *(əhalini)*; **2.** senz *(bir şəxsin hüquqlarının həyata keçirilməsini məhdudlaşdıran şərt; bir müəssisəni siyahıya daxil etmək üçün şərt)*

**census-paper** ['sensəs.peıpə(r)] *n* siyahıya almaq üçün blank; sorğu blankı / listi

**cent** [sent] *n* 1 sent (0,01 dollar);
◊ **to pay to the last ~** son qəpiyinə qədər ödəmək

**centenarian**[1] [ˌsentı'neərıən] *n* yüz və yüzdən artıq yaşı olan adam

**centenarian**[2] [ˌsentı'neərıən] *adj* yüzyaşlı

**centennial** [sen'tenjəl] *adj* **1.** yüzillik; **2.** yüz ildə bir dəfə olan / baş verən

**center** ['sentnə(r)] *n amer.* = **centre**[1,2]

**centimeter** ['sentı.mı:tə(r)] *n amer.* = **centimetre**

**centimetre** ['sentı.mı:tə(r)] *n* santimetr

**centner** ['sentnə(r)] *n* sentner *(100 kiloqrama bərabər çəki ölçüsü)*

**central** ['sentrəl] *n amer.* mərkəzi telefon stansiyası;
◊ **Weather Central** hava məlumat bürosu

**central** ['sentrəl] *adj* **1.** mərkəzi; **Central Asia** Mərkəzi Asiya; *Our house is very central Bizim evimiz lap mərkəzdədir*; **2.** əsas, ən vacib; aparıcı, başlıca; **~ idea** əsas fikir/ideya; **to be ~ to smth.** bir işdə əsas / aparıcı olmaq; *This is central to his criticism Onun tənqidində ən əsas məsələ budur*; **3.** mərkəzi, baş; **~ station** əsas/ mərkəzi elektrik stansiyası; **~ nervous system** mərkəzi sinir sistemi

**centralism** ['sentrəlızm] *n* **1.** mərkəzçilik; **2.** mərkəzləşdirmə, mərkəzləşmə
**centralist** ['sentrəlıst] *n* mərkəzçi; mərkəzçilik tərəfdarı
**centrality** ['sentrəlıtı] *n* **1.** mərkəzlik; **2.** topluluq, bir yerə toplanma
**centralization, -isation** [,sentrəlaı'zeıʃn] *n* **1.** mərkəzləşdirmə, mərkəzləşmə, mərkəzləşdirilmə; **2.** bir yerə toplama / yığma
**centralize, -ise** ['sentrəlaız] *v* **1.** mərkəzləşdirmək; toplamaq, yığmaq *(bir yerə)*, bir yerə toplamaq; **2.** toplaşmaq, yığışmaq *(bir yerə)*, bir yerə yığılmaq
**centrally** ['sentrəlı] *adv* mərkəzdə, mərkəzdən; ~ **situated** mərkəzdə yerləşmiş; ~ **guided** mərkəzdən idarə olunan
**centre**[1] ['sentə^r] *n* **1.** mərkəz; orta; mərkəzi nöqtə; ~ **of the table/of the square** stolun/meydanın mərkəzi; ~ **of infection** infeksiyanın mərkəzi; *Though London is Britain's capital, it is not at the centre of the country Baxmayaraq ki, London Britaniyanın paytaxtıdır, o, ölkənin mərkəzində deyil;* **2.** mərkəz, məntəqə; ~ **of learning** elm mərkəzi; **information** ~ məlumat mərkəzi; *She likes to be the centre of attention all the time O həmişə diqqət mərkəzində olmağı sevir*
**centre**[2] ['sentə^r] *v* **1.** toplamaq, yığmaq *(bir yerə)*, bir yerə toplamaq / cəmləşdirmək; **2.** əsas fikri olmaq; cəmləşmək, toplanmaq; *Our thoughts centred on the young girl about to be married Bizim əsas fikirlərimiz ərə getməyə hazırlaşan gənc qızın üzərində cəmləşmişdi*
**centrifugal** [sen'trıfjugəl] *adj fiz.* mərkəzdənqaçan; ~ **force** mərkəzdənqaçan qüvvə; ~ **lubrication** *tex.* püskürtmə yolu ilə yağlama; ~ **pump** *tex.* mərkəzdənqaçan nasos
**centrifugation** [sen,trıfju'geıʃn] *n* sentrifuqa vasitəsilə tərkib hissələrinə ayırma
**centrifuge**[1] ['sentrıfju:dʒ] *n* **1.** sentrifuqa *(qarışıq maddələri (mayeləri) mərkəzdənqaçan qüvvə vasitəsilə tərkib hissələrinə ayıran cihaz);* **2.** *k.t.* separator *(üzlü süddən qaymağı ayıran cihaz)*
**centrifuge**[2] ['sentrıfju:dʒ] *v* sentrifuqa vasitəsilə tərkib hissələrinə ayırmaq *(mayeləri)*
**centripetal** [sen'trıpıtl] *adj fiz.* mərkəzəqaçan; ~ **force** mərkəzəqaçan qüvvə
**centripetence** [sen'trıpıtəns] *n* mərkəzə qaçma; mərkəzəqaçan qüvvə
**centripetency** [sen'trıpıtənsı] *n* = **centripetence**
**centrist**[1] ['sentrıst] *n siya.* sentrist, mərkəzçi *(sentrizm / mərkəzçilik tərəfdarı)*
**centrist**[2] ['sentrıst] *adj siya.* sentrizm, mərkəzçilik
**centuple**[1] ['sentjupl] *adj* yüz qat, yüz dəfə
**centuple**[2] ['sentjupl] *v* yüz dəfə artırmaq, yüzə vurmaq
**century** ['sentʃərı] *n* **1.** əsr, yüzillik dövr / vaxt /zaman; **from the 17**[th] ~ on yeddinci əsrdən; **in the 21**[st] ~ 21-ci əsrdə; *We are living in the 21*[st] *century Biz 21-ci əsrdə yaşayırıq;* **a ~ of great inventions** böyük kəşflər əsri; **centuries of oppression** əsarət/zülm əsrləri; **2.** *tar.* senturiya **(1)** *qədim Romada 100 nəfərdən ibarət qoşun dəstəsi; 2) qədim Romada əhalinin mülk və yaş senzinə görə bölgüsü);* **3.** yüz; **to score a** ~ yüz xal yığmaq/toplamaq *(kriket oyununda)*; **4.** yüzlük *(dollar və ya funt)*
**century-plant** ['sentʃurıpla:nt] *n bot.* səbur *(bitki)*
**cephalalgia** [,sefə'lældʒıə] *n tib.* baş ağrısı
**cephalalgic** [,sefə'lældʒık] *n tib.* baş ağrısı dərmanı
**ceramic** [sı'ræmık] *adj* **1.** keramika; **2.** dulusçuluq
**ceramics** [sı'ræmıks] *n* **1.** keramika; **2.** dulusçuluq istehsalı; **3.** keramika/dulusçuluq məmulatları
**ceramist** ['serəmıst] *n* keramika mütəxəssisi; dulusçu
**ceratoid** ['serətɔıd] *adj* buynuzaoxşar, buynuzabənzər; buynuz kimi
**cereal**[1] ['sıərıəl] *n* **1.** dənli bitkilər; **2.** *amer.* yarmalanmış taxıldan hazırlanmış məmulatlar *(qarğıdalı partlağı və s.)*; vələmir sıyığı
**cereal**[2] ['sıərıəl] *adj* taxıl, dənli
**cerebellum** [,serı'beləm] *n (pl həm də* **-lla)** *anat.* beyincik
**cerebral** ['serıbrəl] *adj* **1.** *anat. tib.* qafa tası, beyin; baş beynə aid olan; ~ **cortex** baş-beyin qabığı; ~ **hemisphere** beyin yarımkürəciyi; ~ **haemorrhage** beynə qan sızma; ~ **concussion** beyin silkələnməsi; **2.** *fon.* serebral; ~ **consonants** serebral samitlər *(dil ucunun damağa tərəf əyilməsilə əmələ gələnləri);* **3.** mücərrəd, quru; ~ **music** mücərrəd / quru musiqi
**cerebrate** ['serıbreıt] *v* fikirləşmək; götür-qoy etmək, beynini tərpətmək
**cerebration** [,serı'breıʃn] *n* beyin fəaliyyəti; beyin işi
**cerebrology** [,serı'brɔlədʒı] *n* baş-beyin haqqında elm
**cerebropathy** [,serı'brɔpəθı] *n tib.* baş-beynin xəstələnməsi, baş-beyin xəstəliyi
**ceremonial**[1] [,serı'mounjəl] *n* **1.** mərasim, təşrifat; qayda, üsul, nizam, nizam qaydaları *(etiket və ya diplomatik protokolla müəyyənləşdirilmiş); According to church ceremonial the priest kisses the Bible before reading from it Kilsə mərasim qaydasına görə oxumazdan əvvəl keşiş Bibliyanı öpür;* **the ~ of the court** saray etiketi/mərasimi; **2.** *hərb.* qələbə/zəfər bayramını keçirmə qaydaları; ~ **and honours** *dən.* mərasim və ehtiram; **3.** adət, qayda; *Tonight there will be a tribal ceremonial of great importance to mark the chief's birthday Başçının doğum gününü qeyd etmək üçün bu axşam böyük əhəmiyyət kəsb edən qəbilə mərasimi olacaq;* **4.** ayinlər kitabı
**ceremonial**[2] [,serı'mounjəl] *adj* **1.** formal, tam rəsmi; protokol; mərasimə/adətə aid olan, etiketə uyğun, təntənənin qaydasına və ya diplomatik protokola müvafiq olan; ~ **call** protokol görüşü *(səfirin prezidentlə və s.)*; **to bud ~ welcome** rəsmi olaraq salamlamaq *(hörmətli qonağı)*; **2.** təntənəli, dəbdəbəli, təmtəraqlı; ezəmətli, həşəmətli; parad; ~ **dress** parad geyim forması; dəbdəbəli / təmtəraqlı geyim; ~ **laurel wreath** təntənəli dəfnə çələngi; ~ **parade** *hərb.* hərbi parad; **3.** mərasim, mərasimə aid, dini mərasimə aid olan; **the ~ part of worship** ibadət mərasiminin formal tərəfi
**ceremonious** [,serı'mounjəs] *adj* **1.** ədəb gözləyən, nəzakət gözləyən, çox ədəbli / nəzakətli; nazlı, ədalı, əzilib-büzülən; **2.** zabitəli, ciddi, rəsmiyyətpərəst; ~ **politeness** ciddi / rəsmi nəzakət; ~ **bow** rəsmi təzim
**ceremony** ['serımənı] *n* **1.** mərasim; təntənə; təşrifat; **wedding** ~ toy mərasimi; *The wedding ceremony was beautiful Toy mərasimi gözəl idi;* **2.** rəsmiyyət, etiket; mərasim, üsul, qayda; **without** ~ sadəcə, çəkinmədən; **to stand upon ~ 1)** təşrifat gözləmək; özünü ciddi aparmaq / tutmaq / saxlamaq; **2)** etiketə ciddi riayət etmək; **3.** boş/mənasız rəsmiyyət; **4.** adət, qayda; mərasim, ayin;
◊ **master of ceremonies 1)** konferansye *(konsert proqramının nömrələrini tamaşaçılara elan edən adam)*; **2)** aparıcı *(televiziya verilişini və s.);* **3)** başçılıq edən *(bal-maskarada və s.)*; **4)** təşrifat məmuru *(saraylarda, məclislərdə təşrifat və mərasim qaydalarına baxan məmur)*
**cerise**[1] [sə'rı:z] *n* açıq-qırmızı rəng
**cerise**[2] [sə'rı:z] *adj* açıq-qırmızı
**certain** ['sə:tn] *adj* **1.** müəyyən; dəyişməz, dəyişməyən, daimi; **on ~ days** müəyyən edilmiş / təyin olunmuş günlərdə; **under ~ conditions** müəyyən vəziyyətlərdə; **2.** bəzi, bəziləri, bir para; ~ **relief** bir qədər yüngüllük; **for ~ reasons** bəzi mülahizələrə görə; **to a ~ degree** müəyyən dərəcədə; **to feel ~ of** əmin olmaq; *I'm not certain Mən əmin deyiləm;* **to make ~** yoxlamaq, əmin olmaq, yəqin etmək; *Make certain your facts before you argue Mübahisə etməzdən əvvəl faktlarını/faktlarınızı yoxla/yoxlayın;* **3.** biri, birisi, bir nəfər; **a ~ Mr. Brown** Cənab Braun adlı biri/birisi; **a ~ person** birisi, bir nəfər; **4.** sadiq, sədaqətli; vəfalı; etibarlı; şübhəsiz; şəksiz; **to face ~ death** şəksiz ölümə getmək; *There is no certain cure for this disease Bu xəstəliyi sağaltmaq üçün etibarlı dərman yoxdur; The fact is certain Fakt şübhə doğurmur; The evidence is certain Fakt etibarlıdır / mötəbərdir / sahihdir;* **to regard smth. as ~** bir şeyi şübhəsiz hesab etmək; *It is certain to happen Bu hökmən /labüdən baş verəcək; He is certain to come O hökmən gələcək;* **5.** əmin, arxayın, xatircəm; sakit, təmkinli;
◊ **for ~** şübhəsiz, qəti, yəqin, mütləq, hökmən; *I don't know for certain Mən əmin deyiləm, qəti deyə bilmərəm*
**certainly** ['sə:tnlı] *adv* **1.** əlbəttə, əlbət, şübhəsiz, qəti, yəqin, hökmən, mütləq; *He will certainly visit you O əlbəttə/şübhəsiz/mütləq/hökmən sənə /sizə baş çəkəcək;* **2.** *Suala cavab verərkən işlədilir: -May I go home now? -Certainly -Mən indi evə gedə bilərəmmi? – Əlbəttə; -May I ask you a question? –Certainly -Sənə/ Sizə sual vermək olarmı? - Əlbəttə, Şübhəsiz*
**certainty** ['sə:tntı] *n* **1.** əminlik, yəqinlik, arxayınlıq; xatircəmlik; inam, qənaət; əzm; **with ~** əminliklə, inamla, qəti olaraq; *I can't say with certainty Mən qəti olaraq deyə bilmərəm;* **scientific ~** elmi əminlik / qənaət/yəqinlik; **2.** qətilik, qaçılmazlıq, labüdlük; ~ **of death** ölümün qətiliyi /labüdlüyü/qaçılmazlığı; **to know** ***smth.*** **for a ~** bir şeyi şübhəsiz / tam bilmək; **3.** *arx.* təminat, girov
**certifiable** ['sə:tıfaıəbl] *adj* təsdiq edilə bilən, əminliklə etiraf edilən, dəyişməsi ehtimal olunmayan
**certificate**[1] [sə'tıfıkıt] *n* **1.** şəhadətnamə; sertifikat *(vəsiqə, şəhadətnamə);* ~ **of birth** doğum şəhadətnaməsi; metrika; ~ **of character** xasiyyətnamə; ~ **of health** sağlamlıq haqqında arayış; ~ **of origin** *tic.* yükün məzmunu barədə arayış; ~ **of seaworthiness** *dən.* dəniz səfərinə yararlılıq haqqında sertifikat/arayış; ~ **of service** *hərb.* xidməti xasiyyətnamə; ~ **of discharge** *hərb.* xidmətdən tərxis olunma arayışı; ~ **of capacity** *amer. hərb.* rütbə vermək üçün aparılan/keçirilən attestasiya; **2.** *amer.* məktəb, yaxud kurs qurtarmaq haqqında arayış; attestat; **3.** akt; ~ **of audit** yoxlama aktı
**certificate**[2] [sə'tıfıkeıt] *v* **1.** təsdiq etmək, təsdiqləmək; təsdiq etmək *(imza və möhürlə)*; **2.** arayış/şəhadətnamə vermək; attestat vermək; **3.** *hüq.* bir kəsin hüququnu təsdiq etmək *(yazılı)*
**certificated** [sə'tıfıkeıtıd] *adj* şəhadətli, arayışı olan; şəhadət almış; **a ~ teacher** dərs demək hüququna malik olan müəllim; **a ~ nurse** şəhadətnaməsi olan dayə / tərbiyəçi
**certification** [,sə:tıfı'keıʃn] *n* **1.** arayış/şəhadətnamə vermə; **2.** şəhadətnamə, vəsiqə; **3.** şəhadət vermə *(fakt haq.)*; təsdiq etmə
**certificatory** [sə'tıfıkətərı] *adj* təsdiq edən, şəhadət verən, təsdiqləyən; **letter** ~ yazılı xasiyyətnamə / zəmanət / arayış
**certified** ['sə:tıfaıd] *adj* **1.** təsdiq edilmiş, təsdiqlənmiş; ~ **copy** təsdiq edilmiş/təsdiqlənmiş nüsxə; ~ **invoice** *tic.* təsdiq edilmiş/təsdiqlənmiş faktura *(buraxılan və ya yola salınan malların siyahısı)*; **2.** yoxlanmış, zəmanət/qarantiya verilmiş; bəyanilmiş, icazə verilmiş *(rəsmi olaraq)*; ~ **milk** yoxlanılmış / istifadəsinə icazə verilmiş süd; ~ **seeds** kondision/kondisiyaya

uyğun *(yəni keyfiyyətli)* toxumlar; 3. müvafiq hüququ olan; diplomlu, rəsmi olaraq təyin edilmiş; ~ **public accountant** diplomlu ictimai buxalter / yoxlama aparan, mühasib-müfəttiş
**certify** [ˈsə:tıfaı] *v (pt, pp* **-fied)** 1. təsdiq etmək, təsdiqləmək; doğru olduğunu sübut etmək; *This is to certify Bununla təsdiq edilir; I certify this a true copy Əsli ilə düzdür;* **to ~ a death** ölümü təsdiq etmək; ölüm haqqında şəhadətnamə / arayış vermək; *The bank certified my account Bank mənim hesabımı təsdiq etdi;* 2. inandırmaq, təsdiq etmək *(imza və möhürlə)*; zamin olmaq; **to ~ smb. of smth.** bir kəsi bir şeyə inandırmaq; *I certify to his character Mən ona zamin dururam, Mən ona zəmanət verirəm;* 3. xəstə olmağı haqqında şəhadət vermək *(xüs. psixi)*; **to ~ to smb.'s insanity** bir kəsin ağlının başında olmadığını təsdiqləmək; **to ~ smb. as insane** bir kəsin dəli olduğunu rəsmi olaraq etiraf etmək; *The doctors certified him Həkimlər onun ruhi xəstə olduğunu təsdiq etdilər*
**certiorate** [ˌsə:tıɔ:ˈreıt] *v hüq.* rəsmi olaraq xəbər vermək/xəbərdar etmək/bildirmək
**certitude** [ˈsə:tıtju:d] *n* 1. şəxsi inam / etimad, yəqinlik, əminlik, inanma; 2. *d.d.* şübhəsizlik, labüdlük
**cerumen** [sıˈru:men] *n* qulaq çirki
**cervical** [ˈsə:vıkəl] *adj anat.* boyun; peysər; ~ **nerves** boyun sinirləri; ~ **cord** onurğa beynin / haram iliyin boyun hissəsi; ~ **vertebra** boyun fəqərələri
**cervix** [ˈsə:vıks] *n (pl həm də* **cervices)** *lat. anat.* 1. boyun; 2. boğaz; ~ **uteri** uşaqlığın boğazı
**cessation** [seˈseıʃn] *n* 1. kəsmə, qurtarma, dayandırma; kəsilmə, qurtarılma, dayandırılma; dayanma, durma; ~ **of arms / of hostilities** müharibəni dayandırma, barışıq/sülh əldə etmə; **a momentary ~ of breathing** nəfəsi/nəfəs alması bir an dayandırma; 2. fasilə; *We arranged a week-long cessation of fighting with the enemy Biz düşmənlə vuruşda bir həftəlik fasilə etmək üçün razılığa gəldik*
**cession** [ˈseʃn] *n* 1. güzəşt etmə, güzəştə getmə, keçmə; 2. *hüq.* güzəştə getmə, vermə *(əmlakı, hüququ)*; ~ **of rights** hüquqları güzəştə getmə / vermə
**chafe[1]** [tʃeıf] *n* 1. sıyrıntı, cırmaq yeri, döyüb yara etmə *(ayaqqabı və s. haq.)*; 2. acıqlanma, acıqlandırma; əsəbiləşmə, əsəbiləşdirmə; **in a ~** acıqlı / əsəbi halda; 3. *arx.* qəzəb, hirs, qeyz; hiddət, azğınlıq
**chafe[2]** [tʃeıf] *v* 1. sürtmək, sürtülmək; əzmək; *Her skin chafes easily Onun dərisi tez sürtülür; Stiff collars chafe the neck Cod yaxalıq boyunu sürtür;* 2. sürtüb yara etmək *(paltar, ayaqqabı və s.)*; *Her shoes chafed the skin on her feet Onun ayaqqabıları ayaqlarını sürtdü; Woollen garments chafe some skins Yun paltar bəzi dəriləri sürtür / sürtüb yara edir;* 3. sürtüb dağıtmaq/üzmək; köhnəltmək, geyib köhnəltmək / dağıtmaq; 4. **(on, upon, against)** sürtülmək, sürtünmək; 5. acıqlanmaq, hirslənmək, əsəbiləşmək, hiddətlənmək, özündən çıxmaq; **to ~ against restraints** məhdudiyyət barəsində şikayətlənmək; **to ~ under affront** təhqir olunmaqdan bərk həyəcan keçirmək; **to ~ under teasing** istehzaya məruz qaldığına görə özündən çıxmaq / hiddətlənmək; *He chafes at a mere nothing O hər xırda şeydən ötrü özündən çıxır;* 6. hirsləndirmək, hiddətləndirmək, acıqlandırmaq; *The delay chafed her Ləngimə onu əsəbiləşdirdi;* 7. sürtüb qızdırmaq/ isitmək /istiləmək;
◊ **to ~ at the bit** hövsələsizlik etmək
**chaff[1]** [tʃa:f] *n* I cırnatma, lağ, lağa/araya qoyma
**chaff** [tʃa:f] *n* II 1. saman, köçəl, püfə; 2. navala *(heyvan yemi)*
**chaff[2]** [tʃa:f] *v* I sataşmaq, lağa/araya qoymaq, ələ salmaq
**chaff** [tʃa:f] *v* II xırda-xırda doğramaq *(kövşəni)*
**chaff-cutter** [ˈtʃa:f.kʌtəʳ] *n k.t.* kövşən doğrayan dəzgah, yemdoğrayan maşın
**chaffer[1]** [ˈtʃa:fəʳ] *n* I istehzaçı, rişxəndçi, masqaraçı, adamoynadan, adam ələsalan
**chaffer** [ˈtʃa:fəʳ] *n* II şadara
**chaffer[2]** [ˈtʃa:fəʳ] *v* 1. qiymət haqqında mübahisə etmək, sövdələşmək, qiymətləşmək; 2. boş-boş danışmaq, çərənçilik etmək, boş danışıqla məşğul olmaq; 3. *d.d.* alver etmək, alverlə / ticarətlə məşğul olmaq
**chafferer** [ˈtʃæfərəʳ] *n d.d.* alverçi, çərçi; qazancına alıb satan
**chaffinch** [ˈtʃæfıntʃ] *n zool.* alacəhrə *(quş)*
**chaffy** [ˈtʃa:fı] *adj* 1. yumşaq, püfə ilə örtülmüş; 2. boş, mənasız, gərəksiz; ~ **thoughts** mənasız / boş fikirlər
**chafing** [ˈtʃeıfıŋ] *n* 1. sürtülmə, sürtmə; çəkmə *(dərman və s.)*; 2. sürtüb yara etmə *(dərini bir şeylə)*; 3. acıqlanma, acıqlandırma, əsəbiləşmə, əsəbi-ləşdirmə; 4. *tex.* sürtülmədən yırtılma / dağılma; 5. qızdırma, istilətmə, qızışdırma; 6. *tib.* tərdən bişmiş yer, tərdən bişmə
**chafing-dish** [ˈtʃeıfıŋdıʃ] *n* 1. stolun üstündə xörəyi qızdırmaq üçün qazan *(adətən elektriklə işləyən)*; elektrik termosu; 2. kürə, manqal
**chafing-pan** [ˈtʃeıfıŋpæn] *n* = **chafing-dish**
**chain[1]** [tʃeın] *n* 1. zəncir; **iron ~** dəmir zəncir; **watch and ~** zəncirli saat; *The bridge was supported by heavy iron chains hanging from 2 towers Körpünü 2 qüllədən asılmış ağır dəmir zəncirlər saxlayırdı; Chain's weakest link is the measure of its strength Zəncirin möhkəmliyi onun ən zəif həlqəsinin davamlılığı ilə müəyyənləşir;* 2. dağ silsiləsi, silsilə dağlar; 3. *pl* qandal, zəncir, buxov; **in ~s** qandalda; **~s of colonialism** müstəmləkəçilik əsarəti / boyunduruğu; 4. ardıcıllıq, əlaqə, sıra, cərgə, silsilə; ~ **of events** hadisələrin ardıcıllığı/gedişi; ~ **of proofs** faktların sırası; ~ **of discourse** mühakimənin gedişi; 5. *fiz.* zəncirvari; **nuclear fission ~** *fiz.* zəncirvari nüvə reaksiya



**chain[2]** [tʃeın] *v* 1. zəncirlə bağlamaq, zəncirləmək; **to ~ prisoners together** dustaqları bir zəncirlə qandallamaq; **to ~ (up) the dog** iti zəncirləmək; 2. zəncirdə saxlamaq
**chain-bridge** [ˈtʃeınˈbrıdʒ] *n* zəncirli körpü
**chained** [tʃeınd] *adj* zəncirlənmiş, zəncirlə bağlanmış/bərkidilmiş; ~ **to the wall** zəncirlə divara bağlanmış
**chain-gang** [ˈtʃeıngæŋ] *n* bir zəncirə buxovlanmış dustaqlar / dustaqlar qrupu *(həbsxanadan kənarda işlədilmək üçün aparılan dustaqlar haq.)*
**chainless** [ˈtʃeınlıs] *adj* 1. zəncirsiz; 2. *şair.* azad, asılı olmayan, sərbəst
**chainlet** [ˈtʃeınlıt] *n* balaca zəncir
**chain-mail** [ˈtʃeınˈmeıl] *n tar.* dəmir geyim, zireh
**chain-smoke** [ˈtʃeınsmouk] *v* arası kəsilmədən / ara vermədən papiros çəkmək; papirosu papirosa calamaq
**chain-smoker** [ˈtʃeınˌsmoukəʳ] *n* çox papiros çəkən adam
**chair[1]** [ˈtʃeəʳ] *n* 1. stul; kreslo; **cane ~** hörmə stul /kreslo; **folding ~** örtülüb-açılan / bükülən /qatlanan stul; 2. sədrlik; sədrin yeri; **to take the ~** iclasın sədri olmaq; iclası açmaq / açıq elan etmək; **to put in the ~** sədr seçmək *(iclasa)*; *The chair is taken İclas açıq elan edilir;* **to be / to sit in the ~** sədrlik etmək *(iclasa)*; **to leave the ~** iclası bağlamaq; 3. sədr *(iclasda)*; **to address the ~** iclasın sədrinə müraciət etmək; 4. kafedra *(auditoriyada mühazirəçi və ya məruzəçi üçün hündür yer)*; 5. professorluq, professor vəzifəsi; 6. hakimlik, münsiflik; məhkəmə vəzifəsi; 7. *amer.* elektrik stulu; **to send to the ~** ölüm cəzasına məhkum etmək; **to go to the ~, to get the ~** elektrik stulunda edam olunmaq; 8. kafedra; *She's holding a chair of chemistry O, kimya kafedrasına rəhbərlik edir;*
◊ ~ **days** qocalıq
**chair[2]** [tʃeəʳ] *v* 1. oturtmaq, əyləşdirmək *(bir kəsi)*; 2. yüksəltmək, böyütmək *(vəzifədə)*; 3. taxta əyləşdirmək/oturtmaq; 4. sədr seçmək; 5. sədr olmaq, sədrlik etmək
**chair-bed** [ˈtʃeəˈbed] *n* kreslo-çarpayı
**chair-car** [ˈtʃeəˈka:ʳ] *n amer. d.y.* yumşaq qatlanan kreslosu olan sərnişin vaqonu
**chairman** [ˈtʃeəmən] *n (pl* **-men** [-mən]) sədr; *He is our best and most experienced chairman O bizim ən yaxşı və ən təcrübəli sədrimizdir; She was elected (the) chairman of the meeting O, iclasın sədri seçildi*
**chairmanship** [ˈtʃeəmənʃıp] *n* sədrlik, sədr vəzifəsi, sədrlik etmə
**chairwoman** [ˈtʃeəˌwumən] *n (pl* **-women** [-ˌwımın]) sədr qadın / qız
**chalcographer** [kælˈkɔgrəfəʳ] *n* oymaçı *(mis üzərində oyma açan)*
**chalcographist** [kælˈkɔgrəfıst] *n* = **chalcographer**
**chalcography** [kælˈkɔgrəfı] *n* mis üzərində oyma açma
**chalk[1]** [tʃɔ:k] *n* 1. təbaşir; **to write in ~** təbaşirlə yazmaq; 2. təbaşir parçası *(yazmaq üçün)*; *The teacher wrote with a stick / piece of chalk Müəllim bir parça təbaşirlə yazdı; Do you need some more chalk? Sənə/Sizə bir az da təbaşir lazımdırmı?;*
◊ **as like as ~ and cheese, as different as chalk and cheese** ≅ tamamilə fərqli, əsla oxşarı olmayan; **not to know ~ from cheese** sadəcə şeyləri fərqləndirə bilməmək, heç nə anlamamaq/bilməmək
**chalk[2]** [tʃɔ:k] *v* 1. təbaşirlə yazmaq; 2. təbaşirə bulaşdırmaq; *His coat was chalked all over Onun paltosu bütün/ başdan-başa təbaşirə bulaşmışdı;* 3. ağartmaq, rəngini qaçırtmaq/bozartmaq; *Fear chalked her face Qorxudan o, ağappaq oldu;* **to ~ down** təbaşirlə yazmaq; **to ~ out** təbaşirlə cızmaq *(planı və s.)*; *The general chalked out his plan of attack General öz hücum planının sxemini təbaşirlə cızdı;* **to ~ up** hesabda irəli olmaq; *We've chalked up more points than any other team this year Bu il bizim komanda digər hər hansı bir komandadan çox xal yığıb*
**chalk-pit** [ˈtʃɔ:kpıt] *n* təbaşir karxanası
**chalk-stone** [ˈtʃɔ:kstoun] *n* 1. *miner.* əhəngdaşı; 2. *tib.* oynaqlarda podaqranın qalınlaşması
**chalky** [ˈtʃɔ:kı] *adj* 1. təbaşirli; əhəngli; ~ **clay** *geol.* mergel *(gil və əhəngdən ibarət süxur)*; 2. solğun, təbaşir kimi ağ; 3. *tib.* podaqra
**challenge[1]** [ˈtʃælındʒ] *n* 1. çağırış; çağırma *(yarışa və s.)*; meydan oxuma; **to launch a ~ against smb.** bir kəsi yarışa çağırmaq; bir kəsə meydan oxumaq; **to meet the ~** çağırışı/təklifi/dəvəti qəbul etmək; *He accepted his friend's challenge to swim across the river O, yoldaşının çayı üzüb keçmək haqqındakı təklifini/dəvətini qəbul etdi;* 2. duelə çağırma; **to address a ~ to smb.** bir kəsi duelə çağırmaq; **to have a ~ delivered / brought by a second** sekundant vasitəsilə duelə çağırış göndərmək / almaq; 3. şübhə, sual altına qoyma; şübhə etmə; **to bring smth. into ~** bir şeyi şübhə altına almaq; **to bring smb.'s title into ~** bir kəsin hüququnu qəbul etməmək; 3. *hüq.* məhkəmə iclasçısına etiraz etmə; **peremptory ~** səbəb göstərmədən məhkəmə iclasçılarına etiraz etmə; **~ to the array** bütün jürini rədd etmə; 4. prosesin gedişinə etiraz / etiraz etmə; 5. *amer.* seçicini səsverməyə buraxmama; 6. seçkinin bülletenini/nəticələrini ləğv etmə tələbi; 7. *arx.* iddia, tələb; ~ **of superiority** üstünlük iddiası / tələbi; **to lay ~ to smth.** bir şeyin iddiasında olmaq; 8. səsləmə, haylama,

çağırma *(gözətçi haq.)*; **to give the ~** səsləmək, haylamaq, səsləyib çağırmaq; 9. *ovç.* izə düşdüyünü bildirmək üçün itlərin hürüşməsi

**challenge²** ['tʃælɪndʒ] *v* **1. (to)** yarışa çağırmaq, təklif etmək; meydan oxumaq; **to ~ *smb.* to run a race** bir kəsi qaçış yarışına çağırmaq; *I challenged him to a game of tennis Mən onu bir əl tennis oynamaqda yarışa çağırdım;* 2. şübhələnmək, şübhə etmək; inkar etmək, danmaq; **to ~ *smb.'s* knowledge** bir kəsin biliyinə şübhə etmək; **to ~ the accuracy of a statement** müddəanın dəqiqliyini qəbul etməmək; 3. tələb etmək *(hörmət, diqqət və s.)*, istəmək; *This idea challenges attention Bu fikir düşünmək tələb edir;* 4. rədd/etiraz etmək, qəbul etməmək; 5. *amer.* seçiciyə etiraz etmək *(seçki hüququ olmadığına görə)*; 6. seçki bülleteninin və ya səsvermənin nəticələrinin qeyri-qanuni hesab edilməsini tələb etmək *(qanunçuluğun tələblərinə cavab vermədiyinə görə)*; 7. *hərb.* səsləmək, haraylamaq, səsləyib çağırmaq *(qarovulçu haq.)*; parol / buraxılış vərəqəsi tələb etmək; *The soldier challenged the stranger to say who he was Əsgər yad adamdan kim olduğunu deməyi tələb etdi*

**challengeable** ['tʃælɪndʒəbl] *adj* şübhəli, şübhə doğuran / yaradan

**challenger** ['tʃælɪndʒəʳ] *n* 1. yarışa çağıran; meydan oxuyan; 2. iddiaçı, iddia edən, tələbkar, tələb edən, istəyən; 3. etiraz edən; 4. *hərb.* çağıran/haraylayan gözətçi

**chamber¹** ['tʃeɪmbəʳ] *n* 1. otaq *(yaşayış evində)*; otaq *(kəndli evində)*; apartament *(böyük, qəşəng otaq / mənzil)*; mənzil; **privy ~** kral otağı; əlahəzrətin kabineti; 2. zal, imarət, saray; iclas zalı; **senate ~** senatın iclas zalı; 3. qəbul otağı *(yüksək vəzifəli şəxsin)*; 4. *tib.* palata, otaq *(xəstəxanada)*; 5. mebellə təchiz edilmiş otaq; mebelli otaq; **to live in ~s** mebelli otaqlarda yaşamaq; 6. *hüq. pl* vəkil kontoru; 7. palata *(parlamentdə)*; **Lower / Upper Chamber** aşağı / yuxarı palata; *In Britain the Upper Chamber is the House of Lords, the Lower the House of Commons Britaniyada Lordlar palatası yuxarı, İcmaalar palatası isə aşağı palatadır;* **Chamber of Commerce** ticarət palatası; 8. *anat.* boşluq; *The heart has 4 chambers Ürəyin 4 boşluğu var*

**chamber²** ['tʃeɪmbə] *adj mus.* kamera; **~ orchestra/music** kamera orkestri/musiqisi; **~ concert** kamera musiqisi konserti

**chamber³** ['tʃeɪmbəʳ] *v* 1. kameraya salmaq; 2. *tex.* deşmək, deşik açmaq *(burğu ilə)*

**chambered** ['tʃeɪmbəd] *adj* 1. kameralara bölünmüş/ayrılmış; 2. kameraya salınmış

**chamber-fellow** ['tʃeɪmbə.felou] *n arx.* otaq yoldaşı, bir otaqda yaşayan

**chambermaid** ['tʃeɪmbəmeɪd] *n* 1. ev qulluqçusu; 2. *arx.* kameristka *(keçmişdə xanımların xüsusi xidmətində olan qulluqçu)*

**chamber-master** ['tʃeɪmbə.ma:stəʳ] *n* gedib evlərdə işləyən çəkməçi

**chamber-pot** ['tʃeɪmbə.pɔt] *n* gecə qorşoku

**chameleon** [kə'mi:ljən] *n* 1. *zool.* buqələmun; 2. öz fikrini tez-tez dəyişən/prinsipsiz adam /şəxs *(şəraitdən asılı olaraq)*

**chameleonic** [kə.mi:lɪ'ɔnɪk] *adj* buqələmun kimi, buqələmunaoxşar, dəyişkən

**chameleon-like** [kə'mi:ljənlaɪk] *adj* = **chameleonic**

**chamois¹** ['ʃæmwa:] *n* I *zool.* dağkeçisi, köpkər

**chamois** ['ʃæmɪ] *n* II zamşa *(yumşaq maral dərisi)*

**chamois²** ['ʃæmɪ] *adj* zamşa; **~ gloves** zamşa əlcək

**champ¹** [tʃæmp] *n* I 1. ağzını marçıldatma; marçıltı; 2. iştaha

**champ** [tʃæmp] *n* II *d.d.* çempion

**champ²** [tʃæmp] *v* I 1. ağzını marçıldatmaq; 2. çeynəmək; gövşəmək; 3. gəmirmək *(çaralğanı)*; *The horses were champing their bit Atlar yüyənlərinin çaralğasını gəmirirdilər/çeynəyirdilər;* 4. hövsələsizlik etmək, tələsmək; can atmaq; *The boys were champing to start Oğlanlar yürüşə can atırdılar;* 5. *arx.* dişlərini qıcırdatmaq / şaqqıldatmaq

**champagne** [ʃæm'peɪn] *n* şampan şərabı

**champion¹** ['tʃæmpjən] *n* 1. *id.* çempion; **world / European ~** dünya/Avropa çempionu; **Olympic ~** Olimpiya çempionu; **current/reigning ~** məğlubedilməz / yenilməz / basılmaz çempion; **three times ~** üçqat çempion; 2. qalib, qalibgələn *(adam)*, *(yarışda, sərgidə və s.)*, birinci priz alan *(insan, heyvan və s.)*; *This dog is only young but already you can tell he's a champion Bu it hələ cavandır, lakin demək olar ki o çempiondur;* 3. müdafiəçi, qoruyucu, qoruyan; müdafiə / mühafizə edən; tərəfdar; mübariz *(bir şey uğrunda)*; **~s of peace** sülh uğrunda mübarizlər; 4. *şair.* əsgər, döyüşçü, pəhləvan, qəhrəman

**champion²** ['tʃæmpjən] *adj d.d.* əla, çox gözəl; *"How do you feel?" - "Champion, thank you!" Necəsən?/Necəsiniz?" - "Əla, çox sağ ol / olun!"*

**champion³** ['tʃæmpjən] *v* 1. müdafiə etmək; qorumaq; mübarizə etmək / aparmaq; **to ~ the cause of peace** sülh uğrunda mübarizə aparmaq; **to ~ disarmament** tərk-silah uğrunda mübarizə etmək; 2. *arx.* çağırmaq *(yarışa)*

**championship** ['tʃæmpjənʃɪp] *n* 1. *id.* birincilik, çempionat; birincilik uğrunda mübarizə; **individual ~** şəxsi birincilik; **team ~** komanda birinciliyi; **free style ~** sərbəst üsulla üzgüçülük yarışı; 2. çempion adı / titulu; *I don't think this new fighter can take the championship from him Mən inana bilmirəm ki, bu yeni pəhləvan ondan çempion adını ala bilsin;* 3. **(of)** müdafiə, müdafiə etmə; mübarizə aparma; *His championship of women's rights is well known Onun qadınların hüquqlarını müdafiə etməsi çox yaxşı məlumdur*



**chance¹** [tʃa:ns] *n* 1. hadisə, sərgüzəşt, qəziyyə, əhvalat; **happy/unexpected ~** xoşbəxt / gözlənilməz hadisə; 2. təsadüf, təsadüfilik, təsadüfi olan; **by a lucky ~** xoşbəxt təsadüf nəticəsində; *By what chance? Sən hara, bura hara?*; **to put oneself beyond the reach of ~** özünü təsadüfdən qorumaq; *It was a chance that they met on the road Onların yolda görüşməlləri təsadüf idi;* 3. əlverişli / münasib fürsət / vaxt / imkan; **a ~ to do *smth.*** bir iş görmək üçün/görməkdən ötrü münasib imkan; **to lose the ~** münasib imkandan istifadə etməmək; **to give *smb.* a/the ~** bir kəsə imkan verməmək; *Give me another chance! Mənə bir imkan da ver/verin!*; 4. müvəffəqiyyət, uğur, bəxt; xoşbəxtlik; **to take *one's* ~ with *smth.*** bir şeydə bəxtini sınamaq; 5. şans, mümkünlük, imkan, ehtimal; **to have a good/a fair ~** yaxşı şansı olmaq; **to stand little ~ of success** müvəffəqiyyət/uğur qazanmaq üçün az şansı / imkanı olmaq; **not the slightest ~** heç bir şans; *There's just a chance that he'll help you Onun sənə/sizə azacıq da olsa, kömək etmək şansı var; There is a chance of success Müvəffəqiyyət üçün şans var; There is no chance of success Müvəffəqiyyət üçün heç bir şans /imkan yoxdur; He has every chance Onun hər cür şansı / imkanı var;* **the theory of ~s** *riyaz.* ehtimal nəzəriyyəsi; 6. risk *(təhlükə, qorxu, xətər)*; **games of ~** qumar oyunu; *We can't take any chances Biz risk edə bilmərik;* 7. tale, bəxt, qismət; bəxtin dönüklüyü; **to await no gifts from Chance** *şair.* taledən heç bir hədiyyə gözləməmək; **to bear stoutly the ~ of fortune** taleyin bütün dönüklüyünə sakitcə dözmək;

◊ **to have an eye for the main ~** imkandan /şansdan istifadə etmək; *Let chance decide! Qoy tale deyən olsun!*; **to leave things to ~** məsələni taleyin ixtiyarına buraxmaq

**chance²** [tʃa:ns] *adj* təsadüfi; gözlənilməyən; **~ encounter** təsadüfi qarşılaşma; **~ meeting** təsadüfi görüş; *I had a chance meeting with your brother today; he seemed glad to see me Mən bu gün sənin / sizin qardaşınla/qardaşınızla təsadüfən görüşdüm; mənə elə gəldi ki, o məni görməyə şad oldu;* **~ shell** *hərb.* təsadüfi düşən mərmi

**chance³** [tʃa:ns] *v* 1. cəsarət/ürək/risk etmək; *Let's chance it Gəlin risk edək;* **to ~ one's luck** bəxtini / qismətini sınamaq; 2. baş/üz vermək, vaqe olmaq, təsadüfən baş vermək; *She chanced to be in the park when I was there Mən parkda olanda o da təsadüfən orada idi; If it should chance to rain we'll take a taxi home Əgər təsadüfən yağış yağsa, biz evə taksi ilə gedərik; If I chance to find it Əgər onu tapmaq mənə müyəssər olsa;* **to ~ on/upon** təsadüfən rast gəlmək/tapmaq

**chanceable** ['tʃa:nsəbl] *adj* təsadüfi, gözlənilməyən

**chance-child** ['tʃa:nstʃaɪld] *n* qeyri-qanuni uşaq, bic

**chance-comer** ['tʃa:n.kʌməʳ] *n* gözlənilməz qonaq, gözlənilmədən gələn qonaq

**chanceful** ['tʃa:nsful] *adj* 1. hadisələrlə dolu/zəngin; 2. təsadüfdən asılı olan, təsadüfi; 3. təhlükəli, xətərli, qorxulu, xatalı

**chancel** ['tʃa:nsəl] *n kils.* mehrab, səcdəgah, qurbangah

**chancellery** ['tʃa:nsələrɪ] *n* 1. kansler vəzifəsi, kanslerlik; 2. kansler idarəsi/təsisatı; 3. kansler və onun tabeçiliyində olanların işlədiyi bina; 4. dəftərxana *(səfirliyin, konsulluğun iş yeri)*

**chancellor** ['tʃa:nsələʳ] *n* 1. kansler *(1). 1945-ci ilə qədər Almaniyada baş nazir, 1949-cu ildən isə AFR-də hökumət başçısı; 2) Çar Rusiyasında adi mülki rütbə; 3) İngiltərədə lordlar palatasının sədri və ya maliyyə naziri)*; **Chancellor of the Exchequer** Maliyyə naziri *(İngiltərədə)*; **Federal Chancellor** federal kansler *(Almaniyada)*; 2. *dip. amer.* səfirliyin birinci katibi; 3. universitet rektoru *(İngiltərədə, ABŞ-da)*

**chancellorship** ['tʃa:nsələʃɪp] *n* kansler adı / rütbəsi, kanslerlik

**chancel-table** ['tʃa:nsəl'teɪbl] *n kils.* taxt, taxt-tac

**chancery** ['tʃa:nsərɪ] *n* 1. lord-kansler məhkəməsi *(1873-cü ilə kimi Böyük Britaniyanın ali məhkəməsi, hazırda ədalət məhkəməsinin bir şöbəsi)*; 2. *hüq.* ədalət məhkəməsi *(ABŞ-ın bəzi ştatlarında)*; 3. dəftərxana; arxiv; 4. *id.* başdan yapışma / tutma

**chancy** ['tʃa:nsɪ] *adj d.d.* qorxulu, təhlükəli, xətərli, xatalı; *That was a chancy thing to do; you could have been killed O, qorxulu /təhlükəli iş idi; səni/sizi öldürə bilərdilər*

**chandelier** [.ʃændɪ'lɪəʳ] *n* 1. çilçıraq, qəndil, lüstr; 2. *kils.* çilçıraq

**chandler** ['tʃa:ndləʳ] *n* 1. şam fabrikantı; 2. şam alverçisi, şam alıb-satan

**chandlery** ['tʃa:ndlərɪ] *n* 1. şam anbarı; 2. süd məmulatı; 3. baqqaliyyə malları

**change¹** [tʃeɪndʒ] *n* I 1. dəyişmə, dəyişdirmə; dəyişiklik; təbəddülat; **~ of weather** havanın dəyişməsi; **~ of scene** səhnənin dəyişməsi; **~ of the scenes** *teatr.* dekorasiyanın dəyişməsi/dəyişdirilməsi; **~ of heart /mind** 1) niyyətin/məqsədin/məramın dəyişməsi; 2) inamda dəyişmə; **~ of front** 1) *hərb.* cəbhənin dəyişməsi/dəyişdirilməsi; 2) köklü dəyişiklik/dəyişmə; **~ of tide** qabarma və çəkilmənin növbələşməsi; **to make a ~ in the agenda** gündəlik məsələdə dəyişiklik etmək; *Many changes have taken place Çox dəyişikliklər baş verib;* **~ for the better / for the worse** yaxşılığa / pisliyə doğru dəyişmə; **the ~**

**from winter to spring** qışdan yaza keçmə; **for a ~** müxtəliflik/çeşidlilik xatirinə; *You need a change Sənə/Sizə şəraiti dəyişmək lazımdır*; 2. dəyişdirmə, dəyişmə, dəyişdirilmə; əvəz etmə /edilmə/olunma; **a ~ of underwear** alt paltarını dəyişdirmə / dəyişmə; 3. xırda *(pul)*, xırdalama *(pulu)*; **to give ~ for a pound note** bir funtu xırdalamaq; 4. dəyişmə *(başqa valyutaya)*; 5. qalıq, artıq, artığı qaytarma/vermə *(pul haq.)*; *He got ninepence change O, doqquz pens qalıq aldı; Keep the change! Qalığı qaytarma/qaytarmayın*; 6. xırda pul; 7. *d.y.* qatar/paroxod və s. dəyişmə, bir minikdən düşüb o birisinə /başqasına minmə; *No change for Moscow Moskvaya qədər qatar dəyişmə yoxdur;* **to make a ~** qatar/paroxod və s. dəyişmək; qatardan / paroxoddan və s. düşüb başqasına minmək;
◊ **to get no ~ out of *smb.*** bir kəsdən heç bir kömək gözləməmək; **to take the ~ out of *smb.*** bir kəsdən qisas almaq

**change** [tʃeɪndʒ] *n* II birja *(maliyyə sazişləri bağlamaq üçün vasitəçi idarə; alver üçün bazar)*

**change**[2] [tʃeɪndʒ] *v* 1. dəyişmək, dəyişdirmək; mübadilə etmək; **to ~ the course** *dən.* kursu /səmti/istiqaməti dəyişmək; **to ~ *one's* address** ünvanını dəyişmək; **to ~ *one's* mind** fikrini/qərarını dəyişmək; **to ~ colour 1)** rəngini dəyişmək; 2) bənizi / rəngi qaçmaq, saralmaq, qızarmaq; *Success changed him Müvəffəqiyyət onu dəyişdirdi; We changed the room by making a new window Yeni pəncərə açmaqla biz otağın görünüşünü dəyişdirdik; The weather changes very often Hava tez-tez dəyişir; Times change Vaxt dəyişir; The wind has changed from north to east Külək şimaldan şərqə dəyişib; Take the hat back to the shop and change it Papağı mağazaya apar/aparın və onu dəyişdir/dəyişdirin;* 2. paltarını dəyişmək, başqa paltar geymək; **to ~ into a new suit** köhnəni çıxarıb təzə kostyum geymək; *He changed his clothes O, paltarını dəyişdi / başqa paltar geydi; She changed her feet d.d. O, başqa tufli geydi;* **to ~ a bed** yataq ağını dəyişmək; 3. xarab olmaq, korlanmaq; *This colour changes Bu boya / rəng xarab olur*; 4. çürümək, xarab olmaq; *The milk is changed Süd çürüdü*; 5. xırdalamaq *(pulu)*; **to ~ a pound note** bir funtu xırdalamaq; **to ~ a cheque** çeki nağd pula dəyişmək; 6. bir qatardan, gəmidən və s. düşərək başqasına minmək; **to ~ from one train to another** bir qatardan düşüb digərinə minmək; *We change at Baki / at the next stop Biz qatarımızı Bakıda/növbəti dayanacaqda dəyişəcəyik; All change! Qatarın son dayanacağıdır!*; **to ~ into** dönmək, çevrilmək; *Caterpillars change into butterflies Tırtıllar kəpənəyə çevrilir*; **to ~ into a bird** quşa çevrilmək; **to ~ over** yerini dəyişmək/dəyişdirmək; *During the dance, they had to change over Rəqs müddətində onlar yerlərini dəyişməli oldular;*
◊ **to ~ hands** əldən-ələ keçmək, başqasının əlinə keçmək; *The house has changed hands four times Ev dörd dəfə əldən-ələ keçib*; **to ~ *one's* skin** tanınmaz dərəcədə dəyişmək; rəngini dəyişmək; **to ~ face** 180° dönmək, üzünü başqa tərəfə çevirmək; **to ~ sides** düşmən tərəfə /cəbhəsinə keçmək; **to ~ horses in midstream** təhlükəli anda ciddi dəyişiklik etmək

**changeability** [ˌtʃeɪndʒəˈbɪlɪtɪ] *n* dəyişkənlik, səbatsızlıq, qərarsızlıq, tez-tez dəyişmə, dönüklük

**changeable** [ˈtʃeɪndʒəbl] *adj* 1. dəyişkən, səbatsız, qərarsız, tez-tez dəyişən; tezdəyişən, hərdəmxəyal, dəmdəməki; vəfasız; **~ weather** dəyişkən / tez-tez dəyişən hava; **a ~ sort of person** hərdəmxəyal / vəfasız / səbatsız adam; 2. dəyişə bilən, dəyişməyə meylli; 3. rəngdən-rəngə çalan, cürbəcür rəng verən *(ipək və b. material haq.)*

**changeableness** [ˈtʃeɪndʒəblnɪs] *n* = **changeability**

**changeably** [ˈtʃeɪndʒəblɪ] *adv* dəyişkənliklə, qərarsız bir tərzdə / surətdə

**changeful** [ˈtʃeɪndʒful] *adj* = **changeable**

**changeless** [ˈtʃeɪndʒlɪs] *adj* 1. dəyişməyən, dəyişməz, daimi; sədaqətli, vəfalı; 2. dəyişməyə meylli olmayan, dəyişməyə məruz qalmayan; **~ fate** amansız/sərt tale

**changelessly** [ˈtʃeɪndʒlɪslɪ] *adv* dəyişmədən, sədaqətlə, dəyişməz bir tərzdə

**changeling** [ˈtʃeɪndʒlɪŋ] *n* 1. körpə vaxtı gizli olaraq dəyişdirilən uşaq; 2. ağıllı və gözəl uşağın əvəzinə Elf *(Almaniya və Skandinaviya əsatirində pəri)* tərəfindən qoyulmuş axmaq və çirkin uşaq

**changement** [ˈtʃeɪndʒmənt] *n* dəyişmə, dəyişdirmə, dəyişdirilmə; dəyişiklik

**change-over** [ˈtʃeɪndʒˌouvəʳ] *n* 1. keçmə, keçid; **the ~ from English to Russian** ingilis dilindən rus dilinə keçmə; 2. dəyişmə, dəyişdirmə, dəyişdirilmə; yenidən qurma; **~ in editors** redaktorların dəyişdirilməsi

**changer** [ˈtʃeɪndʒəʳ] *n tex.* dəyişdirici açar *(elektrikdə, mexanizmdə və s.)*

**channel**[1] [ˈtʃænəl] *n* 1. *coğ.* boğaz; **The English Channel** La-Manş; *The English Channel separates England from France La-Manş İngiltərəni Fransadan ayırır;* 2. kanal; **~ for irrigation** suvarma üçün kanal; suvarma kanalı; arx; 3. yol, vasitə; mənbə, kanal; **through the usual ~s** adi yolla, adi mənbələrdən; **~s of information** məlumat kanalları; **ordinary diplomatic ~s** adi diplomatik kanallar; **~ of communication 1)** məlumat yetirmək yolu; 2) əlaqə kanalı; **~s of distribution** materialların bölüşdürülmə/paylanma qaydası; **the great ~s of trade** böyük ticarət yolları; *Your only chance of success lies through this channel Sənin / Sizin qələbə qazanmağın / qazanmağınız ancaq bu yolla mümkündür;* 4. *rad. fiz.* tezlik zolağı; *Which channel will you be broadcasting on tonight? Sən / Siz bu axşam hansı tezlik zolağında çıxış edəcəksən / edəcəksiniz?*



**channel**[2] [ˈtʃænəl] *v* 1. kanal çəkmək, kanal /arx qazmaq; 2. istiqamətləndirmək, yönə salmaq; *Try to channel your abilities into something useful Çalış / Çalışın öz bacarığını / bacarığınızı müəyyən bir faydalı səmtə yönəlt / yönəldin*

**chant**[1] [tʃa:nt] *n* 1. *şair.* nəğmə, mahnı, şərqi; təranə; hava; **the ~ of birds** quşların nəğməsi /mahnısı; 2. yeknəsəq mahnı; qəmgin/kədərli /həzin nəğmə; 3. deklamasiya; sözləri uzada-uzada oxuma

**chant**[2] [tʃa:nt] *v* *şair.* 1. oxumaq *(mahnı)*; 2. tərənnüm etmək, tərifləmək, mədh etmək; **to ~ the praises of *smb.*** bir kəsi tərifləmək / mədh etmək; 3. yeknəsəq olaraq oxumaq; 4. sözləri uzada-uzada oxumaq yaxud danışmaq; 5. yeknəsəq olaraq eyni şeyi təkrar etmək; deyinmək, donquldanmaq

**chantage** [ˈtʃa:ntɪʒ] *n* zorakılıq, şantaj; zorla/hədələməklə/fırıldaqla alma *(pul və s.)*

**chanter** [ˈtʃa:ntəʳ] *n* 1. *şair.* oxuyan, xanəndə, müğənni; 2. xorist, xor artisti, xorda oxuyan; 3. regent *(kilsədə xor rəhbəri)*, xormeyster *(xor dəstəsinin rəhbəri)*; 4. *zool.* bağ torağayısı *(quş)*

**chantress** [ˈtʃa:ntrɪs] *n* müğənni qadın / qız

**chaos** [ˈkeɪɔs] *n* xaos; qarma-qarışıqlıq, hərc-mərclik; *After the failure of electricity supplies the city was in chaos İşıqlar söndükdən sonra şəhərdə qarma-qarışıqlıq baş verdi / xaos yarandı*

**chaotic** [keɪˈɔtɪk] *adj* xaotik, qarma-qarışıq, qaydasız, nizamsız; **~ state** xaotik/qarma-qarışıq vəziyyət; *The capital was in a chaotic state after the enemy had seized the airport Düşmən aeroportu tutduqdan / zəbt etdikdən sonra paytaxt qarma-qarışıq bir vəziyyətdə idi*

**chaotical** [keɪˈɔtɪkəl] *adj* = **chaotic**

**chaotically** [keɪˈɔtɪkəlɪ] *adv* xaotik / qarma-qarışıq bir vəziyyətdə / halda

**chap**[1] [tʃæp] *n* I *d.d.* 1. oğlan, yeniyetmə; kişi, adam; **a nice ~** yaxşı oğlan; *John's a nice chap, he'll always help a friend Con yaxşı oğlandır, o həmişə dostlarına kömək edir;* **a merry ~** zarafatcıl, məzəli, kefcil *(adam)*; **old ~** köhnə/əski dost, qoca *(müraciət məqamında işlədilir)*; 2. *arx.* müştəri, sifarişçi

**chap** [tʃæp] *n* II 1. *tib.* sıyırıntı, cırmaq yeri, cırmaq yarası; 2. *tex.* tük kimi çat *(metalda)*; 3. çatlaq, çat, yarıq

**chap** [tʃæp] *n* III 1. alt çənə; 2. ağız, cəhəng *(heyvanlarda)*; *Open your chaps zaraf. Ağzını/Ağzınızı aç / açın*; 3. yanaq

**chap**[2] [tʃæp] *v (-pp-) (pt; pp* **chapped** [-t] *və ya* **chapt***)* I 1. çat / yarıq əmələ gətirmək *(xüs. dəridə)*; *Cold weather chaps the skin Soyuq hava dərini çatladır, Soyuq hava dəridə çat əmələ gətirir;* 2. çatlamaq *(dəri haq.)*; *My skin chaps easily Mənim dərim asanlıqla çatlayır*; 3. vurmaq; *The hour chaps Saat vurur*; **to ~ hands** əl-ələ vermək *(sövdə baş tutarkən)*

**chap** [tʃæp] *v* II *dial.* ticarət / alver etmək; alverlə / ticarətlə məşğul olmaq

**chapel** [ˈtʃæpəl] *n kils.* 1. kiçik kilsə, sovməə; 2. ibadətxana, ibadətgah, məbəd; 3. kapella *(katolik kilsəsində xor dəstəsi; bu dəstə üçün yer)*; 4. ibadət; **to miss a ~** ibadəti buraxmaq; 5. kilsə avadanlığı / ləvazimatı; 6. *arx.* mətbəə; mətbəə işçiləri / fəhlələri; **to hold a ~** mətbəə işçilərinin iclasını keçirmək

**chapelgoer** [ˈtʃæpəlˌgouəʳ] *n (xüs. İngiltərə və Uelsdə)* ardıcıl olaraq kilsəyə gedən

**chapel-master** [ˈtʃæpəlˌma:stəʳ] *n* kapelmeyster *(kapella dirijoru)*

**chaplain** [ˈtʃæplɪn] *n kils.* 1. kapellan *(1. katoliklərdə keşiş köməkçisi;* 2. keşiş *(İngiltərədə ev keşişi)*

**chaplaincy** [ˈtʃæplɪnsɪ] *n* = **chaplainship**

**Chaplain-in-Chief** [ˈtʃæplɪnɪnˈtʃɪ:f] *n* hərbi hava qüvvələrində baş keşiş

**chaplainship** [ˈtʃæplɪnʃɪp] *n* keşiş mənsəbi və ya vəzifəsi

**chaplet** [ˈtʃæplɪt] *n* 1. əklil, çələng, tac *(çiçəklərdən hörülmüş bəzək)*, çiçək hörüyü, zəncirə; **a ~ of roses** qızılgül çələngi / əklili; 2. təsbeh; təsbehlə edilən ibadət; 3. muncuq; həmail, boyunbağı

**chapman** [ˈtʃæpmən] *n (pl* **-men** [men]) 1. xırdavatçı, çərçi; lotokçu, lotokda şey satan; 2. *arx.* tacir, alverçi, möhtəkir *(baha qiymətə satmaq üçün mal alıb yığan adam)*; 3. *arx.* müştəri, alıcı, sifarişçi

**chapped** [tʃæpt] *adj* 1. çatlamış, çat vermiş, çat-çat olmuş; **~ ground** çatlamış / çat-çat olmuş yer *(torpaq)*; **~ hands** çat-çat olmuş əllər; 2. doğranmış, xırda-xırda doğranmış *(ət və s. haq.)*

**chappie** [ˈtʃæpɪ] *n d.d.* oğlan, gənc, cavan

**chapt** [tʃæpt] **to chap** *felinin pt, pp forması*

**chapter** [ˈtʃæptəʳ] *n* 1. fəsil, bölmə *(kitabda)*; **to the end of the ~** fəslin sonuna qədər / kimi; 2. kapitul *(Roma katolik kilsəsində ruhanilər heyəti)*; 3. filial, şöbə *(klubda və s.)*; yerli / aşağı təşkilat *(həmkarlar təşkilatlarının və s.)*; 4. *amer.* tələbə təşkilatı, həmyerlilər birliyi / cəmiyyəti; 5. mövzu, tema; *Enough on that chapter Bu mövzu barəsində bəsdir*;
◊ **the ~ of possibilities** hadisələrin mümkün gedişi

**chapter-house** [ˈtʃæptəhaus] *n* kapitulanın binası; iclas keçirmək üçün kapitula binası

**chapter-lands** [ˈtʃæptəlændz] *n* kapitula *(Roma katolik kilsəsində ruhanilər heyətinə aid olan torpaq)*

**char**[1] [tʃa:ʳ] *n* I 1. günəmuzd/gündəlik iş; 2. *pl* ev işləri; 3. **charwoman** *isminin qısa forması*

**char** [tʃa:ʳ] *n* II 1. kösöv; qalıq; 2. ağac kömürü
**char** [tʃa:ʳ] *n* III *zool.* şimal qızılbalığı
**char** [tʃa:] *n* IV *d.d.* çay
**char[2]** [tʃa:ʳ] *v* I 1. günəmuzd / gündəlik iş görmək; 2. ev yığışdırmaq, ev işləri görmək
**char** [tʃa:ʳ] *v* II (-rr-) 1. yandırmaq; 2. yandırıb kömürə döndərmək / kömür halına salmaq/ gətirmək; 3. yanıb kömürə dönmək
**char** [tʃa:ʳ] *v* III (-rr-) yonmaq, yonub düzəltmək / hamarlamaq *(daşı)*
**charabanc** [ˈʃærəbæŋ] *n* 1. uzaq məsafəyə gedən avtobus; 2. şaraban *(ikitəkərli yüngül minik arabası)*
**character[1]** [ˈkærıktəʳ] *n* 1. xarakter, xasiyyət; xassə; **a man of** ~ xarakterli / iradəli adam; *He has no character at all Onun əsla iradəsi yoxdur*; 2. keyfiyyət; təbiət, xüsusiyyət; *The character of the northern plains is different from that of the South Şimal düzənlikləri öz xüsusiyyətlərinə / təbiətinə görə cənub düzənliklərindən fərqlənir*; **to see a thing in its true** ~ hər-hansı bir şeyi olduğu kimi görmək; 3. rəsmi keyfiyyət; vəziyyət; rütbə; ad, mənsəb; *He spoke in the character of lawyer O, vəkil kimi danışdı;* 4. səciyyəvi xüsusiyyət, fərqləndirici xüsusiyyət / əlamət; **innate** ~**s** anadangəlmə xüsusiyyətlər; **acquired** ~ orqanizmin sonradan qazandığı xüsusiyyət *(anadangəlmə xüsusiyyətlərdən fərqli)*; 5. ad, şöhrət, etibar; *He has an excellent character for honesty O, öz təmizliyi ilə məşhurdur; He has gained the character of a miser O, xəsis kimi şöhrət qazanıb*; **to redeem** ***one's*** ~ yaxşı adını özünə qaytarmaq; 6. yazılı zəmanət; xasiyyətnamə; *The servant came with a good character Xidmətçi yaxşı zəmanətlə gəldi; She gives you a bad character O sizi pisləyir; O sənin / sizin haqqında / haqqınızda pis fikirdədir*; 7. şəxsiyyət, şəxs, adam, sima; **public** ~ ictimai xadim; *He was a great character in his day O öz dövründə böyük şəxsiyyət olub*; 8. *ədəb.* surət, qəhrəman, personaj; 9. rol *(səhnə əsərində)*; **to play the** ~ **of Macbeth** Maqbet rolunu oynamaq/ifa etmək; 10. hərf, heroqlif *(qədim Misir, Çin əlifbasında bütöv məfhumu və ya hecanı ifadə edən işarə)*; 11. rəqəm; işarə; 12. şrift *(mətbəə hürufatı)*; 13. xətt; 14. *pl* əlifba, yazı; **Chinese** ~**s** Çin heroqlifləri; **Runic** ~**s** runik yazıları; 15. damğa; fərqləndirici işarə
**character[2]** [ˈkærıktəʳ] *adj*: ~ **building** tərbiyəvi iş; ~ **certificate** *hərb.* xidməti xasiyyətnamə; ~ **actor** səciyyəvi aktyor; səciyyəvi rol ifa edən/ oynayan aktyor
**character[3]** [ˈkærıktəʳ] *v* 1. üstünə / üstünü yazmaq; 2. oyub yerləşdirmək; yonmaq, rəndələmək; 3. təsvir etmək, göstərmək; 4. *arx.* təəssüm etdirmək, ifadə etmək; 5. xarakterizə etmək, səciyyələndirmək; səciyyəvi xüsusiyyətini göstərmək
**characteristic[1]** [ˌkærıktəˈrıstık] *n* 1. xarakterik / səciyyəvi xüsusiyyət; xüsusiyyət, xassə; **general** ~**s** ümumi xüsusiyyətlər; 2. əlamət, nişanə; ~ **of classification / of division** təsnifatın əlaməti, əşyaların təsnifatı üçün əlamət; 3. *pl hərb.* hərbi əlamətlər
**characteristic[2]** [ˌkærıktəˈrıstık] *adj* səciyyəvi, xarakterik; tipik; **the** ~ **enthusiasm of youth** gənclik üçün tipik/səciyyəvi ruh yüksəkliyi; *It's characteristic of him Bu onun üçün xarakterik xüsusiyyətdir*
**characteristically** [ˌkærıktəˈrıstıkəlı] *adv* xarakterik tərzdə / surətdə
**characterization, -isation** [ˌkærıktəraıˈzeıʃn] *n* xarakteristika *(bir şəxsin və ya bir şeyin səciyyəvi xüsusiyyətlərinin təsviri)*, xasiyyətnamə *(yazılı)*
**characterize, -ise** [ˈkærıktəraız] *v* 1. xarakterizə etmək, xarakteristika vermək; **to** ~ ***smb.*** bir kəsi xarakterizə etmək; 2. təsvir etmək, xüsusiyyətlərini göstərmək; **to** ~ ***smth.*** bir şeyi təsvir etmək; 3. fərqləndirmək, fərqli cəhətlərini göstərmək; *A miser is characterized by greed Xəsis acgözlüklə səciyyələnir*
**characterless** [ˈkærıktəlıs] *adj* xaraktersiz, iradəsiz, zəif iradəli
**charactery** [ˈkærıktərı] *n* 1. fikrin işarələr / simvollar vasitəsilə ifadə edilməsi; 2. işarələr / simvollar sistemi
**charade** [ʃəˈra:d] *n* şarada, tapmaca, bilməcə; müəmma
**charbon** [ˈʃa:bən] *n bayt.* qarayara
**charcoal[1]** [ˈtʃa:koul] *n* 1. ağac kömürü; 2. bitki kömürü; 3. heyvan qalıqlarından əmələ gələn kömür
**charcoal[2]** [ˈtʃa:koul] *adj* kömür; ~ **burner** kömürçü, kömür sənayesi fəhləsi; kömürbasan; ~ **dealer** kömürsatan
**charcoal[3]** [ˈtʃa:koul] *v* 1. kömürlə çəkmək / işarə etmək; 2. buxar / dəm qazı ilə zəhərləmək, buxar / dəm qazından ölmək
**chard** [tʃa:d] *n* 1. *bot.* manqold *(çuğundur növü)*; 2. manqold yarpağı
**charge[1]** [tʃa:dʒ] *n* 1. yük; yükləmə, yüklənmə; ~ **of surety** mümkün ola bilən yükləmə; **additional** ~ əlavə yükləmə/ yük vurma; 2. güllə; 3. qayğı, qeyd, kömək, himayə, baxım; nəzarət etmə, göz yetirmə; saxlama, saxlanma; mühafizə etmə; **to be in** ~ **of** 1) bir kəsin himayəsində olmaq; *I leave the child in charge of him Mən uşağı onun himayəsinə buraxıram*; 2) bir kəsin nəzarətində / himayəsində olmaq; *I leave this in your charge Mən bunu saxlamaq üçün sənə / sizə verirəm*; **to be in** ~ həbsdə olmaq; **to take in** ~ həbs etmək; **to give** ***smb.*** **in** ~ bir kəsi polisin əlinə vermək; **to give** ***smb.*** ~ **over** ***smth.*** 1) bir kəsə bir şeyi etməyi tapşırmaq; 2) bir kəsə bir şey üzərində tam hakimiyyət vermək; 4. himayədə olan adam / şəxs, yetişdirmə; **her little** ~**s** onun balaca yetişdirmələri; *He became a public charge Cəmiyyət onu öz himayəsinə götürdü;* 5. *d.d.* həbs olunan, dustaq, məhbus; 6. *kils.* bir kilsəyə mənsub olan dindarlar; 7. vəzifə, borc; məsuliyyət, cavabdehlik; rəhbərlik, rəhbərlik / başçılıq etmə; *I'm in charge of this office Mən bu müəssisənin rəhbəriyəm; He is in sole charge of the matter Bu iş üçün təkcə o, məsuliyyət daşıyır*; 8. başında durma, başçı olma *(qrup və s. haq.)*; *Who is in charge here? Buranın sahibi kimdir?*; 9. növbə çəkmə, növbədə durma, növbətçilik etmə; növbətçi olma; **officer in** ~ növbətçi zabit; 10. əmr etmə/vermə; göstəriş, sərəncam; əmr; tapşırıq; tələb etmə, tələbnamə, tələb; 11. ittiham etmə, təqsirləndirmə, ittiham; **to lay** ***smth.*** **to** ***smb.'s*** ~ bir kəsi bir şeyə görə ittiham etmək; **to bring / to proffer a** ~ **against** ***smb.*** bir kəsə qarşı ittiham irəli sürmək; **to meet the** ~ ittihamı rədd etmək /qəbul etməmək; *He was arrested on a charge of murder O, qətldə ittiham edilərək həbs olundu; What is the charge against him? Onu nədə ittiham edirlər?*; **to convict on a** ~ **of** ***smth.*** bir şeyə görə ittiham etmək; 12. qiymət, muzd, haqq *(əsasən xidmətə görə)*; **free of** ~ pulsuz, muzdsuz, haqq vermədən; *No charge for admission Giriş pulsuzdur;* ~ **for admission** daxil olma haqqı; **extra** ~ əlavə haqq; **railway** ~**s** dəmir yolu ilə daşıma haqqı; **to lower the postal** ~ **on** ***smth.*** bir şeyi poçt ilə göndərmə haqqını aşağı salmaq; 13. *pl* xərc, çıxar, məsarif; hesab; **at his own** ~**(s)** öz hesabına; **bill of** ~**s** xərcin haqq-hesabı / hesabı; *The sum has been placed to your charge Məbləğ sənin/sizin hesabına / hesabınıza keçirilib;* **to bring / to take on** ~ mədaxilə / gəlirə yazmaq; 14. vergi; rüsum; əlavə etmə, əlavə edilmiş məbləğ; **port** ~**s** liman rüsumu; 15. borc iltizamı, *iqt.* ipoteka *(mülkün girov qoyulması; girov müqabilində alınan borc)*; zəhmət /əziyyət vermə, zəhmətə/əziyyətə salma, yük olma; 16. debet *müh. (gəlir-çıxar dəftərində çatacaq məbləğlərin yazıldığı sol tərəf)*; **floating** ~ qısamüddətli dövlət borcu; 17. *hərb.* 1) hücum; **to rush to the** ~ hücuma keçmək / atılmaq; **to return to the** ~ hücumu təkrar etmək, yenidən hücuma keçmək; 2) *arx.* hücum siqnalı; **to sound the** ~ hücum siqnalı vermək; hücum etmək üçün siqnal vermək; 3) hücum, həmlə, basqın *(heyvan və s. tərəfindən)*, hücum etmə, hücum *(futbolda və s.)*; 18. abunə haqqında qeyd, abunə qeydi
**charge[2]** [tʃa:dʒ] *v* 1. yükləmək, yük vurmaq; doldurmaq; *The lorry was charged to the full Yük maşını ağzına qədər yükləndi*; **to** ~ ***one's*** **memory with trifles** başını boş şeylərlə doldurmaq; *The air was charged with steam Hava buxarla dolmuşdu*; 2. doldurmaq *(silahı, akkumulyatoru)*; 3. tapşırmaq, tapşırıq vermək; həvalə etmək; məsuliyyət qoymaq; *I'm charged to give you this letter Mənə tapşırdılar ki, bu məktubu sənə/sizə verim; He was charged with an important mission Ona mühüm bir tapşırıq verdilər; She has charged me with her son O, oğlunu mənim himayəmə verib;* **to** ~ **with individual responsibility** məsuliyyəti şəxsən üzərinə qoymaq; **to** ~ **oneself with** ***smth.*** bir şeyin qayğısına qalmağı öz üzərinə götürmək; bir şeyə görə məsuliyyət daşımaq; 4. əmr/sərəncam vermək *(yazılı surətdə)*; göstərmək, göstəriş vermək, tapşırmaq; tələb etmək *(tabelikdə olandan)*; *I charge you to open the door! Əmr edirəm qapını aç!/açın! The watchmen were charged to remain at their posts Əmr etdilər ki, gözətçilər öz yerlərində qalsınlar; His mother charged him to look out for his little brother Anası ona tapşırdı ki, balaca qardaşına göz olsun;* 5. *hüq.* ittiham etmək, müttəhim hesab etmək, ittiham irəli sürmək; **to** ~ ***smb.*** **with a crime, to** ~ **a crime upon** ***smb.*** bir kəsi cinayət işlətməkdə ittiham etmək; *We ought not to charge what we cannot prove Sübut edə bilmədiyimiz ittihamı gərək biz irəli sürməyək; The neighbours accused him of murder, but he has never been charged with it Qonşular onun qətldə günahkar olduğunu dedilər, lakin rəsmi olaraq ona qarşı ittiham qaldırılmadı;* 6. təqsirləndirmək; məsuliyyətə cəlb etmək *(səhvə və s. görə)*; *He charged me with neglecting my duty O məni vəzifəmə laqeydlik göstərməkdə təqsirləndirdi;* **to** ~ **a fault on/upon** ***smb.*** səhvi bir kəsin ayağına yazmaq; 7. təyin/müəyyən etmək; qiymət qoymaq; almaq; **to** ~ **a high price** yüksək qiymət qoymaq; *How much do you charge for mending a pair of shoes? Çəkməni təmir etmək üçün nə qədər istəyəcəksən/istəyəcəksiniz? Çəkməni təmir etmək neçəyə başa gələcək/ neçə tutacaq? How much do you charge for packing? Qablaşdırmaq üçün nə qədər alacaqsan/alacaqsınız?; They don't charge for this service Bu xidmət pulsuzdur*; 8. borca yazmaq; *müh.* debetə daxil etmək/yazmaq; **to** ~ **to account** hesaba yazmaq; *Charge these goods to me Bu malları mənim hesabıma yaz/yazın;* 9. *hərb.* 1) hücum etmək, hücuma keçmək; *Our soldiers charged the enemy Əsgərlərimiz düşmənə hücum etdi;* 2) atılmaq, üstünə atılmaq/tullanmaq; hücuma keçmək; *The dog charged at me İt mənim üstümə atıldı / tullandı; Our players charged again and again Bizim oyunçular dəfələrlə hücuma keçdilər;* 10. qazlandırmaq, qaz vurmaq *(suya)*; 11. kitab vermək üçün abonement kitabçasında qeyd aparmaq; 12. nişan almaq *(silah haq.)*; **to** ~ **off** he-

sabdan silmək/çıxartmaq; **to ~ out** vermək *(kitabı)*; **to ~ up** qiyməti qaldırmaq / yüksəltmək

**chargeable** ['tʃa:dʒəbl] *adj* 1. **(with)** irada / ittihama layiq olan; **a person ~ with murder** *hüq.* qətldə ittiham olunan şəxs; *If you kill her, you will be chargeable Əgər sən/siz onu öldürsən-/öldürsəniz sən /siz qətldə ittiham ediləcəksən /ediləcəksiniz*; 2. məsul, cavabdeh; məsuliyyətli; **~ with money** pula məsul/cavabdeh; 3. *(bir kəsin)* hesabına keçirilə bilən, ödənilməli olan; *These debts are chargeable to my account Bu borclar mənim hesabıma yazıla bilər*; 4. vergi qoyula bilən, vergi qoyulmalı olan; 5. *arx.* ağır; çətin, gərgin

**charged** ['tʃa:dʒd] *adj* doldurulmuş, yüklənmiş; **~ with electricity** elektriklə doldurulmuş /yüklənmiş

**chargeful** ['tʃa:dʒful] *adj arx.* 1. ağır, zəhmətli, məşəqqətli, sıxıcı, yorucu; 2. dağıdıcı, dağıdan, viranedici, talanedici, var-yoxdan çıxaran, iflasa səbəb olan; bahalı, qiymətli

**chargeless** ['tʃa:dʒlıs] *adj* 1. pulsuz, havayı, müftə; 2. vergi qoyulmayan, vergiyə cəlb edilməyən

**charge-sheet** ['tʃa:dʒʃi:t] *n* günahlarını/ təqsirlərini/suçlarını göstərməklə həbs olunanların siyahısı yazılan polis protokolu

**charging desk** ['tʃa:dʒıŋdesk] *n* kitab verilən stol *(kitabxanada)*

**charily** ['tʃeərılı] *adv* 1. ehtiyatla, ehmalla, üsullu, ehtiyatkarlıqla; 2. qənaətlə, bədxərclik etmədən, həddindən artıq qənaətlə

**chariness** ['tʃeərınıs] *n* 1. ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq; 2. qənaətcillik, qənaətkarlıq, yığıcılıq; xəsislik, simiclik

**charitable** ['tʃærıtəbl] *adj* 1. xeyriyyə, filantropik; **~ institution** xeyriyyə müəssisəsi; **a ~ club** xeyriyyə klubu; 2. mərhəmətli, şəfqətli, rəhmli, rəhmdil, ürəyinazik, xeyirxah; *Let's be charitable Gəl/ Gəlin xeyirxahlıq göstərək;* **to put the ~ construction on *smth.*** bir şeyə mərhəmətlə / xeyirxahlıqla yanaşmaq; 3. səxavətli, əliaçıq; həssas, qayğıkeş

**charitably** ['tʃærıtəblı] *adv* mərhəmətlə, şəfqətlə, lütfkarlıqla, xeyirxahlıqla; iltifatla

**charity** ['tʃærıtı] *n* 1. mərhəmət, şəfqət, rəhm; həssaslıq, qeydkeşlik, xeyirxahlıq; **Sister of Charity** şəfqət bacısı; *Charity made her give food to the poor Mərhəmət onu kasıblara yemək verməyə sövq etdi;* 2. yumşaqlıq, iltifat, rəhmdillik, mərhəmət, güzəştə getmə, xeyirxahlıq; 3. xeyriyyəçilik, xeyriyyəçi təşkilat; 4. yetimxana; əlillər evi; 5. *pl* xeyirxahlıq fəaliyyəti/işi; *He left his money to charities O, pulunu xeyriyyə işlərinə sərf etmək / xərclənmək üçün verdi*; 6. sədəqə, ehsan; **to beg a ~** *arx.* dilənmək, sədəqə istəmək; 7. *din.* məhəbbət, sevgi; **to be in/to live in ~** sevmək, sevərək yaşamaq; **to be out/to live out of ~** nifrət bəsləmək, məhəbbət bəsləməmək;

◊ *Charity begins at home ≅ Mərhəmət evdən başlanır, Qohumunu sevən qonşusunu da sevər*

**charity-boy** ['tʃærıtıbɔı] *n* yetimxanada böyümüş / tərbiyə almış oğlan

**charity-girl** ['tʃærıtıgə:l] *n* yetimxanada böyümüş/tərbiyə almış qız

**Charity-school** ['tʃærıtısku:l] *n* yetimlər / kasıblar üçün məktəb, yetimxana

**charivari** ['ʃa:rı'va:rı] *n fr.* səs-küy, hay-haray, hay-küy

**charlady** ['tʃa:,leıdı] *n* = **charwoman**

**charlatan** ['ʃa:lətən] *n* 1. şarlatan, yalançı, fırıldaqçı, cüvəllağı; 2. ara həkimi, türkəçarəçi; *That new doctor's a charlatan; he couldn't tell I had a broken arm O təzə həkim fırıldaqçıdır/şarlatandır; mənim qolumun qırıldığını ayırd edə bilmədi*

**charlatanry** ['ʃa:lətənrı] *n* ara həkimliyi, türkəçarəçilik; şarlatanlıq; dava-dərman alverçisi

**Charleston** ['tʃa:lstən] *n* Çarlston *(rəqs növü)*

**charlock** ['tʃa:lɔk] *n bot.* yabanı xardal

**charlotte** ['ʃa:lət] *n aşp.* şarlot *(alma kətəsi)*

**charm**[1] [tʃa:m] *n* I 1. cazibə, lətafət, məlahət, zəriflik, cazibədarlıq, gözəllik, füsunkarlıq, hüsn; **her ~ of manner** onun məlahəti / füsunkarlığı /cazibədarlığı; **~ of style** üslubun zərifliyi /incəliyi/qəşəngliyi /gözəlliyi; *She has charm O, gözəldir/ lətafətlidir/məlahətlidir/füsunkardır;* 2. ovsun, sehr; ovsunlama; **to act like a ~** möcüzə yaratmaq *(dərman haq.)*; **to be under a ~** ovsunlanmaq; valeh/heyran olmaq; 3. tilsim, dua, gözmuncuğu; 4. brelok *(saat zəncirindən və ya bilərzikdən asılan bəzək)*

**charm** [tʃa:m] *n* II gurultu, səs-küy, hay-küy

**charm**[2] [tʃa:m] *v* 1. heyran /valeh /məftun / cəzb /bənd etmək; *She charms every man she meets O görüşdüyü hər bir adamı/kişini məftun/cəzb edir; I'm charmed with your children Mən səninsizin uşaqlarına / uşaqlarınıza vurğunam;* 2. ovsunlamaq, tilsimləmək, tilsimə salmaq; cadu etmək; *The witch charmed the princess and she fell asleep Cadugər qadın şahzadə xanımı ovsunladı və o yuxuya getdi/yatdı;* **a ~ed life** tilsimli/ovsunlu olma *(qılınca, oxa və s. qarşı)*; 3. ilanı öyrətmək/əhliləşdirmək /ram etmək / ovsunlamaq;

◊ **~ed** çox xoşdur, çox şadam; *I'll be charmed to meet your family Sizin ailənizlə tanış olmağa mən çox xoşhal olardım*

**charmer** ['tʃa:məʳ] *n* 1. afət, dilrüba, dilbər, canalıcı; 2. cazibəli / məlahətli adam; 3. ovsunçu, cindar, cadugər; 4. ilan ovsunlayan / ovsunçusu

**charmful** ['tʃa:mfl] *adj* füsunkar, məftunedici; sehrli, ovsunlu

**charming** ['tʃa:mıŋ] *adj* heyranedici, cazibədar, füsunkar; çox gözəl/qəşəng, canalan, könülovlayan, cazibəli, cəzbedici, valehedici, məlahətli, lətafətli; **a ~ girl** məlahətli cazibəli / canalan qız; **a ~ smile** cazibəli / məlahətli / valehdici / cəzbedici təbəssüm; *What a charming idea! Nə qəşəng ideya!, Nə gözəl fikir!*



**charmless** ['tʃa:mlıs] *adj* cazibəsiz, görkəmsiz, cəzb/cəlb etməyən, ürəyəyatmayan, xoşagəlməyən; çirkin, bekara; kifir, biçimsiz, yaraşıqsız

**charmlike** ['tʃa:mlaık] *adj* dua / talisman kimi təsir edən; möcüzəli, ecazkar; yaxşı təsir edən *(dərman haq.)*

**charnel**[1] ['tʃa:nl] *n* 1. = **charnel house**; 2. *d.d.* qəbiristan

**charnel**[2] ['tʃa:nl] *adj* 1. qəbiristan; dəfn; kədərli; 2. qorxunc, qorxulu, dəhşətli, vahiməli; heybətli

**charnel house** ['tʃa:nlhaus] *n* 1. sərdabə, mavzoley; 2. meyitxana, ölüxana *(xəstəxanada)*

**chart**[1] [tʃa:t] *n* 1. dəniz xəritəsi; **Admiralty ~** dəniz xəritəsi; **Marine Survery ~** hərbi-dəniz xəritəsi; 2. xəritə; **aviation ~** aeronaviqasiya /uçuş xəritəsi; **comprehensive/weather /wall / star ~** müfəssəl *(təfsilatlı)*/sinoptik/divar / ulduz xəritəsi; 3. diaqram, sxem; cədvəl; plan; qrafik; **approach ~** limana yanalma planı; **barometric ~** meteoroloji cədvəl; **calculating /calculation ~** hesablama diaqramı; **periodic ~** *kim.* Mendeleyevin dövri sistemi; **temperature ~** *tib.* temperaturun/ hərarətin dəyişdiyini göstərən vərəqə; 4. xartiya *(ictimai-siyasi baxımdan əhəmiyyəti olan bəzi sənədlərin adı)*; fərman; sənəd

**chart**[2] [tʃa:t] *v* 1. xəritəyə köçürmək, xəritədə qeyd etmək; **~ed position** xəritədə qeyd edilmiş yer; 2. cızmaq, çəkmək *(xətt, cızıq)*; cizgi çəkmək; xəritə çəkmək; 3. cədvəl / diaqram / sxem / plan / qrafik tərtib etmək

**charter**[1] ['tʃa:təʳ] *n* 1. xartiya, fərman; **The Great Charter** *tar.* Azadlıq Sevənlərin Xartiyası; **The People's Charter** Çartistlərin xartiyası /proqramı *(1838-ci il)*; **~of pardon** kralın əfv fərmanı/əfv haqqında verdiyi fərman; **Constitutional Charter** konstitusiya, əsas qanun, anayasa; 2. hüquq; imtiyaz, güzəşt; patent; 3. nizamnamə; **Charter of the United Nations** Birləşmiş Millətlər Təşkilatının nizamnaməsi

**charter**[2] ['tʃa:təʳ] *v* 1. imtiyaz/güzəşt vermək; 2. kirayəyə vermək; kirayəyə götürmək *(avtobus, gəmi və s. haq.)*

**chartered** ['tʃa:təd] *adj* 1. imtiyazlı; **~ accountant** buxalter-ekspert; auditor *(keçmişdə hərbi məhkəmələrdə prokuror vəzifəsini ifa edən şəxs)*; 2. sifariş edilmiş, sifarişli; kirayə edilmiş; icarəyə götürülmüş *(avtobus, təyyarə və s.)*

**charterer** ['tʃa:tərəʳ] *n* 1. *dan.* kirəçi, kirələyən *(yüklərini daşıtmaq üçün gəmi kirə edən şəxs və ya müəssisə)*; 2. sifarişçi *(avtobus, təyyarə sifariş edən adam/şəxs)*

**chartism** ['tʃa:tızm] *n tar.* çartizm *(XIX əsrin birinci yarısında İngiltərədə fəhlələrin kütləvi inqilabi hərəkatı)*

**chartist** ['tʃa:tıst] *n tar.* çartist *(çartizm hərəkatı tərəfdarı)*

**charwoman** ['tʃa:,wumən] *n (pl* **-women** [-,wımın]) 1. gəlib ev yığışdıran qulluqçu qadın; 2. süpürgəçi qadın / qız

**chary** ['tʃeərı] *adj* 1. ehtiyatlı, ehmallı, üsullu; ehtiyatkar; **to be ~ of crossing a main road** şose yolunu keçərkən ehtiyatlı olmaq; *She is chary of crossing a main road O, şose yolunu keçərkən ehtiyatlı olur*; **~ of catching cold** soyuqdəymədən ehtiyat edən; 2. utancaq, utanan; **~ of strangers** yadlardan utanan; 3. qənaətcil, qənaətkar, ehtiyatlı; **~ of hospitality** qonaqsevməz; 4. təmkinli, səbirli, özünü saxlaya bilən; çəkinən; **~ of praise** tərif etməkdə təmkinli / özünü saxlaya bilən, tərifdən çəkinən; 5. xırdaçı, vasvası, ehtiyatlı; 6. *arx.* əziz, sevimli, istəkli

**charily** ['tʃeərılı] *adv* 1. ehtiyatla, ehmalla, ehtiyatkarlıqla; 2. utancaq bir tərzdə / surətdə; 3. qənaətcilliklə, qənaətkarlıqla; ehtiyatla; 4. təmkinlə, səbirlə

**chase**[1] [tʃeıs] *n* I 1. təqib, təqib etmə, dalınca qaçma, dalına düşmə, izləmə; **to give ~ to *smb.*** bir kəsin dalınca düşmək, bir kəsi təqib etmək; *The criminal gave us a long chase before we caught him Biz cinayətkarı tutana kimi onu xeyli təqib etdik*; 2. *d.d.* güdmə, pusma, izləmə; tazıları heyvan üzərinə saldırma; 3. ov; ovçular; 4. ovçuların izlədiyi/dalınca düşdüyü heyvan; ov quşları; 5. *dən.* təqib edilən / olunan gəmi; 6. *hərb.* təqib olunan / edilən düşmən

**chase** [tʃeıs] *n* II 1. *tex.* fals *(bitişik / tikiş yeri, bir-birinə bitişdirilmiş nazik dəmir vərəqənin bitişdiyi yer)*, nov, oyuq, yuva; 2. sağanaq, çərçivə *(qiymətli daş üçün)*

**chase**[2] [tʃeıs] *v* I 1. arxasınca / dalınca qaçmaq, təqib etmək; *The cat chased the mouse, but could not catch it Pişik siçanın dalınca qaçdı, lakin onu tuta bilmədi; The boy chased after the butterfly Oğlan kəpənəyin dalınca qaçdı; They chased him in a car Onlar onu maşınla təqib etdilər; They chased each other merrily Onlar şən bir halda bir-birinin dalınca qaçdılar;* **to ~ riches** var-dövlət dalınca qaçmaq; 2. ov etmək, ova çıxmaq, ovlamaq; **to ~ the fox** tülkü ovlamaq/ovuna çıxmaq; 3. qovmaq, qovub çıxartmaq; *We chased the wasp from the room Biz eşşəkarısını qovub otaqdan çıxartdıq;* **to ~ the enemy** *hərb.* düşməni qovmaq; *He was chased out of the country Onu ölkədən qovdular/qovub ölkədən çıxartdılar;* 4. dağıtmaq, qovmaq; **to ~ fears/suspicion, etc. from one's mind** qorxunu / şübhəni başından qovmaq; 5. *tex.* sınaqdan keçirmək, təcrübədən çıxartmaq *(maşını)*; **to ~ away** 1) qovmaq; özündən uzaqlaşdırmaq; 2) *arx.* qovmaq; **to ~ back** geri qovmaq; *They*

chased the bull back with a stick Onlar kələni/buğanı çubuqla geri qovdular;
◊ Go chase yourself amer. kob. Rədd ol / olun!

**chase** [tʃeɪs] v tex. II 1. yiv açmaq (vintdə); 2. oymaq, qazımaq, həkk etmək, naxış açmaq; It's chased on my memory Bu mənim yaddaşımda həkk olunub; 3. sağanağa salmaq/oturtmaq (qiymətli daşı)

**chaser** [ˈtʃeɪsəʳ] n I 1. oymaçı (metal üzərində işləyən); zərb edən, sikkəvuran, naxışbasan (usta); 2. tex. yivaçan (alət)

**chaser** [ˈtʃeɪsəʳ] n II spirtli içkilərdən sonra içilən bir qurtum su, şərbət və s.

**chaser** [ˈtʃeɪsəʳ] n III 1. təqibçi, təqib edən (adam); 2. av. qırıcı təyyarə

**chasing** [ˈtʃeɪsɪŋ] n I təqib etmə/edilmə; təqib; dalınca düşmə, izləmə; dalınca qaçma

**chasing** [ˈtʃeɪsɪŋ] n II oyma işi, oyma, naxış (ağac, sümük və s. üzərində), həkk etmə, naxış açma

**chasm** [ˈkæzəm] n 1. dərin yarğan / dərə; **volcanic ~s** vulkandan/vulkan nəticəsində əmələ gəlmiş yarğan; 2. dərin uçurum, dərinlik, sıldırım; 3. dərin fərq, barışmaz ziddiyyət (münasibətdə, fikirdə və s.); There was a deep chasm between the 2 countries which nearly led to war 2 ölkə arasında mövcud olan dərin ziddiyyət az qala onları müharibəyə sürükləmişdi; 4. ara, aralıq, boşluq; məsafə; fasilə; yarıq; **~ of two centuries** iki əsrlik fasilə; **the ~ his departure has made** onun çıxıb getməsindən sonra əmələ gəlmiş boşluq

**chasmal** [ˈkæzməl] adj dərin, dibsiz, dibi olmayan, çox dərin

**chasse** [ˈʃæseɪ] n fr. şasse (klassik və bəzi bal rəqslərinin elementlərindən biri)

**chasseur** [ʃæˈsəːʳ] n fr. 1. ovçu (peşəkar); alıcı (quş haq.); 2. atıcı, nişançı; 3. zərbaftalı paltar geymiş lakey

**chassis** [ˈʃæsɪ] n tex. 1. şassi (avtomobilin əsas hissəsi – kuzov, motor, bütün mexanizmlər və detalların yerləşdiyi çərçivə), işlək hissələr; şassi (təyyarədə); 2. çərçivə; 3. insan bədəni /əndamı (xüs. cazibədar qadın haq.); She has got quite a chassis! Onun əla əndamı var!

**chaste** [tʃeɪst] adj 1. əxlaqlı, ismətli, bakir, təmiz, saf, məsum, toxunulmamış; günahsız, namuslu; **~ eyes** məsum / günahsız gözlər / baxış; **~ wife** əxlaqlı / ismətli /namuslu arvad; 2. ciddi, tələbkar, zabitəli; təmiz, saf, pak; sadə; sadədil, sadəlövh; təvazökar, utancaq, ədəbli; **~ deportment** təvazökar/ədəbli/sadə davranış; **~ taste** sadə zövq; **~ style** sadə üslub; 3. arx. subay; dul

**chastely** [ˈtʃeɪstlɪ] adv 1. ismətlə, ismətli bir tərzdə, məsum bir halda; 2. ciddiliklə, ciddi bir tərzdə, zabitəli, sadəlövhcəsinə, təvazökarlıqla

**chasten** [ˈtʃeɪsn] v 1. cəzalandırmaq, cəza vermək (islah etmək məqsədilə); 5 years in prison had not chastened him 5 illik həbsxana həyatı onu islah etmədi; 2. ayıltmaq, ağlını başına gətirmək; dayandırmaq, qabağını almaq; cilovlamaq, cilovunu çəkmək, həddini bildirmək, qarşısını almaq; Time has chastened him Zaman onu ayıldıb; Failure will chasten your pride Uğursuzluq sənin/sizin dikbaşlığının / dikbaşlığınızın qarşısını alar; He had been chastened by various experiences in life Həyatın müxtəlif olayları onun ağlını başına gətirmişdi

**chastise** [tʃæsˈtaɪz] v 1. cəza vermək (xüs. bədən cəzası); döymək (çubuqla); 2. cəzalandırmaq

**chastisement** [ˈtʃæstɪzmənt] n cəza (xüs. bədən cəzası); döymə, döyülmə (çubuqla)

**chastity** [ˈtʃæstɪtɪ] n 1. əxlaq, ismət, təmizlik, bəkarət, bakirəlik; məsumluq; namusluluq, günahsızlıq; Defend your chastity if you want to stay morally pure Əgər mənəviyyatca təmiz qalmaq istəyirsənsə/istəyirsinizsə, ismətini qoru/qoruyun; 2. ciddilik, təmizlik; sadəlik; təvazökarlıq; təmkinlilik, səbirlilik, səbir; **~ of dress** paltarın sadəliyi; **~ of style** üslubun ciddiliyi; **~ of renown** adın təmizliyi; 3. çəkinmə, özünü / nəfsini saxlama; təmkinlilik, təmkin

**chastity belt** [ˈtʃæstɪtɪbelt] n ismət / bəkarət kəməri (qədimlərdə cinsi əlaqədə olmamaq üçün qadınların geydiyi və qıfılla bağlanılan xüsusi kəmər)

**chasuble** [ˈtʃæzjubl] n kils. 1. cübbə (ibadət zamanı ruhanilərin geydiyi qolsuz üst paltarı); 2. xələt (zərli-zibalı şah paltarı)

**chat[1]** [tʃæt] n 1. söhbət, danışma, gap; boşboğazlıq, boş danışıq / söhbət, ordan-burdan danışma; **to have a ~** söhbət / gap etmək, ordan-burdan danışmaq; boşboğazlıq etmək, çərənləmək; I had a long chat with him Mən onunla uzun müddət gap / söhbət etdim; We need less chat and more work if we're to finish this job Əgər biz bu işi qurtarmalıyıqsa, az danışıb çox iş görməliyik; 2. dial. həyasızlıq, sırtıqlıq, abırsızlıq, ədəbsizlik, kobudluq, qabalıq, hörmətsizlik

**chat[2]** [tʃæt] v naqqallıq/boşboğazlıq etmək, çənə vurmaq, laqqırtı vurmaq; oradan-buradan danışmaq

**chattel[1]** [ˈtʃætl] n 1. adətən pl hüq. mülk, əmlak, mal, var (adət. daşına bilən); **goods and ~s** bütün daşına bilən şəxsi əmlak; **~s real** daşınmaz əmlak; **personal ~s, ~s personal** daşınar əmlak; 2. arx. qul, təhkimli kəndli

**chattel[2]** [ˈtʃætl] adj: **~ slavery system** qul əməyi sistemi; **~ mortage** şəxsi əmlakı girov qoyaraq götürülən borc

**chatter[1]** [ˈtʃætəʳ] n 1. boşboğazlıq, boş danışıq/söhbət, laqqırtı, çərən-pərən, hədyan; I dislike chatter Mən boşboğazlığı /boş danışığı /laqqırtını sevmirəm; 2. civilti, cikkgilti; cəhcəh (quş haq.), quşların səs-küyü/hay-küyü; qığıldama, qaqqıldama; 3. şırıldama, şırıltı (su haq.); 4. 1) cingilti, cingildəmə; 2) taqqıltı, tıqqıltı; **~ of typewriter keys** yazı makinasının dillərinin tıqqıltısı; 5. gurultu; The chatter of the enemy's guns could be heard in the city Düşmən toplarının gurultusu şəhərdə eşidilirdi

**chatter[2]** [ˈtʃætəʳ] v 1. naqqallıq/boşboğazlıq etmək, çərənləmək, laqqırtı vurmaq; dil boğaza qoymamaq; **to ~ like a magpie** sağsağan kimi ötmək, kəvəzəlik etmək; 2. ağızdan qaçırtmaq, açıb demək (sirri); 3. civildəmək, cikkildəmək (quş haq.); 4. şırıldamaq, şırıltı ilə axmaq (su haq.); 5. cingildəmək; 6. döymək, taqqıldamaq, taqqıldatmaq; dəymək (diş); I was so cold my teeth were chattering Mən elə üşüyürdüm ki, dişim dişimə dəyirdi/dişlərim şaqqıldayırdı; 7. qeybət etmək, dalca danışmaq;
◊ Who chatters to you will chatter of you at.söz. Başqasından sənə/sizə qeybət edən, səndən/sizdən də başqasına qeybət edəcək

**chatterbox** [ˈtʃætəbɔks] n 1. boşboğaz, çoxdanışan, çərənçi; qeybətçi; lağlağı; gəvəzə, hərzə, naqqal; 2. amer. jarq. pulemyot

**chatterer** [ˈtʃætərəʳ] n boşboğaz, çoxdanışan, naqqal, hərzə, çərənçi (adam)

**chattery** [ˈtʃætərɪ] adj boşboğaz, naqqal, çoxdanışan, çərənçi; sirr saxlamayan

**chattiness** [ˈtʃætɪnɪs] n boşboğazlıq, naqqallıq, çərənçilik; söhbətcillik, danışqanlıq

**chatty** [ˈtʃætɪ] adj jarq. 1. boşboğaz, naqqal, çərənçi; danışqan, söhbətcil, çoxdanışan; I wish she weren't so chatty Kaş o bu qədər boşboğaz/naqqal/çərənçi olmayaydı; 2. danışıq (üslub haq.); 3. sərbəst, təbii; qeyri-rəsmi, rəsmi olmayan (söhbət, müsahibə)

**chauffeur[1]** [ˈʃoufə] n muzdlu sürücü (başqasının şəxsi maşınını sürən)

**chauffeur[2]** [ˈʃoufə] v sürücü/şofer işləmək (muzdla), sürücü / şofer olmaq (muzdla)

**chauvinism** [ˈʃouvɪnɪzm] n şovinizm (ifrat millətçilik)

**chauvinist[1]** [ˈʃouvɪnɪst] n şovinist (qatı millətçi)

**chauvinist[2]** [ˈʃouvɪnɪst] adj = **chauvinistic**

**chauvinistic** [ˌʃouvɪˈnɪstɪk] adj şovinizm

**chaw[1]** [tʃɔː] n kob. 1. çeynəmə; marçıltı, ağzını marçıldatma; 2. gövşəmə; kövşək

**chaw[2]** [tʃɔː] v 1. çeynəmək; gövşəmək; 2. ağzını marçıldatmaq

**cheap[1]** [tʃiːp] n arx. çox aşağı qiymət, ucuz qiymət; ucuz alınmış şey, ucuz bazarlıq; **on the ~, for ~** ucuz, aşağı qiymətə; She got some new trousers on the cheap down at the market O, bazarda ucuz qiymətə şalvar aldı

**cheap[2]** [tʃiːp] adj 1. ucuz; Vegetables are very cheap in summer Tərəvəz yayda çox ucuz olur; Bread is cheap in this shop, it costs twice as much over the road Bu mağazada çörək ucuzdur, yolun o tərəfində iki dəfə bahadır; This is the cheapest restaurant in town Bu, şəhərdə ən ucuz restorandır; 2. asan, asan əldə edilən; **~ victory** asan/asan əldə edilən qələbə; The army won a cheap victory over the enemy Ordu düşmən üzərində asan qələbə çaldı/asanlıqla qələbə qazandı; 3. qiymətdən düşmüş, aşağı qiymətdə olan (valyuta haq.); 4. pis, dəyəri olmayan, bir şeyə dəyməyən; **~ jewelry** saxta daş-qaş; **~ finery** kasıb/miskin geyim; 5. yaramaz, alçaq, rəzil, əclaf; hörmətə layiq olmayan; **~ trick** yaramaz / alçaq hiylə; **to feel ~** özünü narahat hiss etmək, utanmaq; **to hold smth. ~** saymamaq, ucuz tutmaq; He held his wife's love cheap so she left him O, arvadının məhəbbətini ucuz tutdu, buna görə də arvadı onu tərk etdi; **dirt ~** çox aşağı qiymət; That dress was dirt cheap in the other shop I wish I would have bought it there O paltar o biri mağazada çox aşağı qiymətə idi, kaş mən onu oradan alaydım; **to make oneself ~** özünü alçaltmaq / gözdən salmaq; He's made himself cheap by his unpleasant behaviour Xoşagəlməz davranışı ilə o özü özünü gözdən saldı

**cheap[3]** [tʃiːp] adv 1. ucuz, ucuz qiymətə; **to buy / to sell ~** ucuz almaq / satmaq; I was very lucky to get the coat so cheap Bəxtim gətirdi, paltonu belə ucuz aldım; 2. asanca, yüngül; **to come / to get off ~** asanca xilas olmaq / canını qurtarmaq; I wish she wouldn't act so cheap Kaş o belə yüngül hərəkət etməyəydi

**cheapen** [ˈtʃiːpən] v 1. ucuzlaşmaq, ucuzlanmaq, qiymətdə aşağı düşmək / enmək; 2. ucuzlaşdırmaq, qiymətini aşağı salmaq /endirmək; **to ~ production** istehsalın maya dəyərini aşağı salmaq; By your nasty behaviour you've cheapened yourself in everyone's opinion Yaramaz davranışınla / davranışınızla sən / siz özünü / özünüzü hamının nəzərində ucuzlaşdırdın/ucuzlaşdırdınız; 3. arx. qiymətləşmək, qiymət danışmaq; sövdələşmək, qiymət üstündə çənələşmək/çənə döymək /mübahisə etmək

**cheap-jack** [ˈtʃiːpdʒæk] adj 1. keyfiyyətsiz, pis, pis/aşağı keyfiyyətli, ucuz; yaramaz; **~ films** pis/pis keyfiyyətli filmlər; 2. keyfiyyətsiz/ucuz mal istehsal etmək və ya satmaq yolu ilə pul qazanmaq istəyən

**cheaply** [ˈtʃiːplɪ] adv 1. ucuz, ucuz qiymətə; **to buy/to sell smth. ~** bir şeyi ucuz almaq/satmaq; 2. məc. asanca, yüngülcə, asanlıqla; She got off cheaply O, asanlıqla canını qurtardı

**cheapness** [ˈtʃiːpnɪs] n ucuzluq; **~ of vegetables** tərəvəzin ucuzluğu

**cheat[1]** [tʃiːt] n 1. fırıldaq, hiyləgərlik, adam aldatma, dələduzluq, kələkbazlıq, kələk; aldatma; 2. fırıldaqçı, hiyləgər, dələduz, kələkbaz, yalançı, hiyləbaz, haramzadə

**cheat[2]** [tʃiːt] v fırıldaqçılıq / hiyləgərlik / dələduzluq etmək, adam aldatmaq; **to ~ at exami-**

**nation** imtahanda fırıldaqçılıq / dələduzluq etmək *(şparqalkadan və s. istifadə etmək)*; **to ~ smb. out of his money** fırıldaqçılıq / hiyləgərlik / kələkbazlıqla bir kəsin pulunu almaq; **to ~ at cards** qumar oyununda fırıldaq / hiyləgərlik işlətmək; **to ~ on** ***smb.*** 1) bir kəsə qarşı fırıldaq / dələduzluq etmək; 2) *jarq*. ər-arvadlıqda vəfasız çıxmaq/olmaq; arvadını /ərini qoyub başqası ilə bir yastığa baş qoymaq; 3) bir kəsi aldatmaq / axmaq yerinə qoymaq; bir kəsi yolundan çıxartmaq; **to ~ death** möcüzə nəticəsində ölümdən yaxa qurtarmaq; **to ~ time** vaxt keçirmək; **to ~ the eye** gözü aldatmaq

**cheatable** [ˈtʃi:təbl] *adj* tez aldanan/inanan, sadəlövh, sadədil, hər şeyə inanan

**cheatee** [ˈtʃi:ti:] *n d.d.* aldadılmış, aldanmış *(adam)*; məğmun, fırıldağın / dələduzun / kələkbazlığın qurbanı

**cheater** [ˈtʃi:təʳ] *n* **1.** yalançı, fırıldaqçı, kələkbaz, adam aldadan; **2.** *arx.* vergi yığan

**check¹** [tʃek] *n* I *amer.* çek

**check** [tʃek] *n* II **1.** manеə, əngəl, çətinlik; dayanma, əylənmə, durma, dayandırma; ləngimə, yubanma, gecikmə; **to serve as a ~** 1) mane / əngəl olmaq, pozmaq; 2) cilovlamaq, qarşısını almaq; *Wind acts as a check on speed Külək sürətli hərəkətə mane / əngəl olur; His illness gave a check to our plans Onun xəstəliyi bizim planımıza mane/əngəl oldu*; **to keep in ~** əldə saxlamaq, nəzarət etmək/altına almaq; *Keep your emotions in check Hisslərinizi cilovlayın*; **to keep a ~ on** ***smth.*** bir şeyə nəzarət etmək, bir şeyi əlində saxlamaq; *Keep a check on your tongue Düşünmədən danışma / danışmayın*; **2.** yoxlama, yoxlanma, nəzarət, kontrol; **accuracy ~** dəqiqliyin yoxlanılması; **spot ~s** *poliqr.* seçmə yolu ilə korrektura *(nabor səhvlərinin düzəldilməsi, təshih edilməsi)*; **3.** işarə, nişan, quş, qeyd etmə / edilmə *(yoxlama zamanı qoyulan işarə)*; **4.** nömrə *(qarderobda)*; **hat ~** papağın əvəzinə verilən nömrə *(qarderobda)*; **5.** yarlıq *(malların üstünə yapışdırılan və onların adını, növünü, çəkisini, qiymətini və s. göstərən kağız)*; baqaj qəbzi; **a ~ for a suit-case** çamadana görə qəbz; **6.** hesab *(restoranda)*; **7.** kontramarka *(bilet əvəzində verilən pəta, talon)*; **8.** dama-dama *(parçanın üstündə şəkil)*; dama-dama parça; şotlandka *(iri xanalı parça növü)*; **9.** *şahm.* şah; **double ~** iki qat şah; **~ to the king** şaha şah; **perpetual ~** daimi şah; **10.** *ovç.* izi itirmə *(ov iti haq.)*

**check²** [tʃek] *adj* **1.** kontrol, nəzarət; yoxlama; sınama, sınaq; **~ analysis** sınaq analizi; **~ experiment** yoxlama sınağı/təcrübəsi; **~ flight** *av.* sınaq uçuşu; **~ point** nəzarət-buraxılış məntəqəsi; **~ station** *hərb.* texniki yoxlama məntəqəsi; **~ sample/specimen** kontrol nümunə; **~ test** yoxlama testi; **2.** dama-dama; **~ handkerchief /coat/trousers, *etc.*** dama-dama əl yaylığı/palto/şalvar və s.; **3.** saxlayan, qarşısını alan, ləngidən, qarşısını kəsən; **~ dam** qarşısını kəsən / alan bənd / sədd;

◊ **~ wine** ola şərab *(yoxlanılmış, testdən keçmiş)*

**check³** [tʃek] *v* **1.** yoxlamaq, nəzarət/tədqiq / təftiş etmək; araşdırmaq; tutuşdurmaq, tutuşdurub yoxlamaq, müqayisə etməklə yoxlamaq; **to ~ figures** rəqəmləri yoxlamaq; **to ~ by sight** gözəyarı müəyyən etmək/yoxlamaq; **to ~ for errors** səhvləri düzəltmək; **to ~ an instrument** cihazı yoxlamaq/testdən keçirmək; **to ~ against** ***smth.*** bir şeylə tutuşdurmaq/tutuşdurmaqla yoxlamaq; **to ~ *one's* speed** sürətə nəzarət etmək; **to ~ the examination papers** imtahan biletlərini yoxlamaq; *Have you checked the examination papers, Sir? Cənab, imtahan biletlərini yoxlamısınızmı?; - Is the baby sleeping? - I'll just go and check - Uşaq yatırmı? - İndicə gedib yoxlayaram*; **2.** dayandırmaq, saxlamaq, əyləmək; qabağını almaq; mane olmaq, maneçilik törətmək; cilovlamaq, qarşısını almaq / kəsmək; **to ~ the advance of the enemy** düşmənin irəliləməsinin qarşısını almaq, düşmənin irəliləməsinə mane olmaq; **to ~ anger / laugh /love** hirsi/gülməyi/məhəbbəti cilovlamaq; **to ~ the growth** inkişafı ləngitmək, inkişafa mane olmaq; *He checked his impetuous son O, azğın oğlunun qarşısını aldı*; **to ~ a fire** yanğının qarşısını almaq; **to ~ oneself** dayanmaq, durmaq; səbir etmək, özünü/ nəfsini saxlamaq; *He checked himself just as he was about to blurt out his indignation O indicə partlayacaq qəzəbini cilovladı*; **3.** *amer.* təhvil vermək, saxlamaq üçün vermək; *They checked their coats before taking their seats in the theatre Onlar teatrda yerlərini tutmazdan əvvəl paltolarını qarderoba verdilər*; **4.** quş qoymaq *(yoxlama zamanı)*, işarə etmək; **5.** *şahm.* şah demək / vermək; **6.** *arx.* cərimə etmək, cərimələmək *(fəhləni)*; **7.** töhmətləndirmək, qulaqburması vermək; söyüb danlamaq; **to ~ back** 1) yenidən / dübarə / bir də / bir daha yoxlamaq; 2) bir də / bir daha / təkrarən soruşmaq *(telefonla danışarkən)*; 3) *id.* müdafiə olunmaq, müdafiəyə keçmək; **to ~ in** 1) qəbz almaqla təhvil vermək; 2) qeydə almaq; 3) qeydə alınmaq *(mehmanxanada, iclasda və s.)*; **8.** *jarq.* ölmək, dünyasını dəyişmək; **to ~ off** quş qoymaqla qeyd etmək *(yoxlama zamanı)*; **to ~ out** *amer.* 1) işi qurtarıb gedərkən qeydə alınmaq; 2) mehmanxanada haqq-hesabı ödəyib / verib getmək; 3) edilmiş bazarlığın haqq-hesabını etmək və çek vurmaq *(özünəxidmət mağazalarında kassirin yanında)*; **to ~ up** yoxlamaq; **to ~ up on** ***smb.*** bir kəsi yoxlamaq *(onun keçmişini, xarakterini müəyyənləşdirmək məqsədilə)*; **to ~ up the marks** *id.* yolları nişanlamaq; **to ~ with** 1) tutuşdurmaq, tutuşdurub yoxlamaq; 2) uyğun gəlmək / olmaq; *His statement checks with yours Onun məlumatı səninki /sizinki ilə uyğun gəlir*



**checkable** [ˈtʃekəbl] *adj* **1.** qarşısı alına bilən, qarşısını almaq mümkün olan; **2.** yoxlanıla bilən, yoxlanması mümkün olan, nəzarətə alına bilən

**checkage** [ˈtʃekɪdʒ] *n* çıxma, çıxılma, tutma, tutulma, çıxılan/tutulan pul *(əmək haqqından)*

**checkback** [ˈtʃekbæk] *n amer.* təkrar yoxlama

**checked** [tʃekt] *adj* **1.** saxlanmış, əyləndirilmiş; qabağı alınmış, yubadılmış, ləngidilmiş, gecikdirilmiş; dayandırılmış; **2.** təmkinli, səbirli; qarşısı alınmış *(qəzəb, qeyz, hirs və s.)*; **3.** yoxlanılmış, "yoxlanılmışdır" *(sənədə yazılmış yazı)*; **4.** nazik çatla örtülmüş

**checker** [ˈtʃekəʳ] *n* I **1.** nəzarətçi, hesablayıcı; yoxlayıcı, mətni tutuşdurub yoxlayan *(mətbəədə, nəşriyyatda)*; **2.** *amer. jarq.* donosçu, xəbərçi, çuğulçu

**checker** [ˈtʃekəʳ] *n* II *amer.* dama, dama oyunu

**checkerboard** [ˈtʃekəbɔ:d] *n* şahmat taxtası

**checking** [ˈtʃekɪŋ] *n* **1.** yoxlama, sınama, sınaq, yoxlanma, sınanma; **2.** ləngimə, yubanma, gecikmə; ləngitmə, yubatma, gecikdirmə

**checkless** [ˈtʃeklɪs] *adj* heç bir şeylə qarşısı alınmayan; manеəsiz, əngəlsiz, sərbəst

**check-list** [ˈtʃeklɪst] *n* kontrol siyahı; siyahı

**checkman** [ˈtʃekmən] *n* (*pl* **-men** [mən]) **1.** kontrolçu; **2.** hesabçı, hesablayıcı

**checkmate¹** [ˈtʃekˈmeɪt] *n* **1.** *şahm.* şah və mat; **2.** tam məğlubiyyət, darmadağın etmə/edilmə; tar-mar etmə/edilmə; tar-mar; yerlə yeksan etmə/edilmə, xarabaya döndərmə / döndərilmə; **to give ~ to** dağıtmaq, darmadağın etmək, tar-mar etmək, tam məğlubiyyətə uğratmaq

**checkmate²** [ˈtʃekˈmeɪt] *v* **1.** *şahm.* mat etmək; **2.** tar-mar/darmadağın etmək *(düşməni)*; **3.** dalaşdırmaq, aranı vurmaq, savaşdırmaq; iflic vəziyyətə salmaq, zəiflətmək, sarsıtmaq *(düşməni)*; planı pozmaq; **to ~ *smb.'s* ingenuity** bir kəsi aldatmaq, tora salmaq

**check-nut** [ˈtʃeknʌt] *n tex.* kontrqayka *(tərs yivli qayka)*

**checkoff** [ˈtʃekɔf] *n* = **checkage**

**check-out** [ˈtʃekˈaut] *n* **1.** kontrol, nəzarət, yoxlama; təcrübə, sınaq, sınama, sınaqdan keçirmə, təcrübədən/sınaqdaq keçirmə; **2.** *av.* təyyarə ilə tanışlıq *(təyyarəçi haq.)*; **3.** işin qurtarması; əlaqənin kəsilməsi

**check over** [ˈtʃekouvəʳ] *v* yoxlamaq; *Please, check this piece of work over and say if you see any mistakes Zəhmət olmasa, bu işi yoxla/yoxlayın və orada hər-hansı səhvin olub-olmadığını de / deyin*

**check-point** [ˈtʃekpɔɪnt] *n* **1.** *hərb.* orientr *(səmt göstərən, səmt göstərən hər bir şey)*; **2.** kontrol-buraxılış məntəqəsi; *There are a number of checkpoints on the border between the two countries Bu iki ölkənin sərhədində bir sıra nəzarət-buraxılış məntəqəsi var*

**check-room** [ˈtʃekru:m] *n* **1.** qarderob *(paltar şkafı)*; **2.** qarderob otağı, paltarsaxlanan yer *(ictimai binalarda)*

**checkrow¹** [ˈtʃekrou] *adj k.t.* kvadrat yuva; **~ pocket planting** kvadrat yuva üsulu ilə əkmə / basdırma; **~ planter** kvadrat-yuva üsulu ilə səpmə

**checkrow²** [ˈtʃekrou] *v k.t.* kvadrat-yuva üsulu ilə əkmək / səpmək

**check-taker** [ˈtʃekˌteɪkəʳ] *n* **1.** *teatr.* biletə baxan, bilet yoxlayan işçi; **2.** *d.y.* konduktor *(vaqonlarda nizama baxan, bilet satan və yoxlayan işçi)*

**check-till** [ˈtʃektɪl] *n* kassa cihazı *(çek vurmaq üçün)*

**checkup** [ˈtʃekˈʌp] *n* **1.** yoxlama, müayinə etmə *(texniki, tibbi)*; **to enter a hospital for a ~** müayinə üçün xəstəxanaya daxil olmaq; **to give *smb.* a ~** bir kəsi müayinədən keçirmək / müayinə etmək; *His doctor gave him a check-up and found nothing wrong Həkimi onu müayinə etdi və hər şeyin qaydasında olduğunu müəyyən etdi*; **2.** kontrol, nəzarət; **3.** təftiş etmə / edilmə, təftiş, yoxlanış

**checky** [ˈtʃekɪ] *adj* dama-dama, xana-xana

**cheek¹** [tʃi:k] *n* I **1.** yanaq; **rosy ~s** al yanaqlar; *Her cheeks went red after she ran up the stairs Pilləkənləri qaçaraq çıxdıqdan sonra onun yanaqları qızardı*; **2.** yanbız;

◊ **~ by jowl** yanaşı, yan-yana; dostcasına, səmimi; **to sit ~** yanaşı oturmaq

**cheek** [tʃi:k] *n* II **1.** həyasızlıq, sırtıqlıq, abırsızlıq; ədəbsizlik; utanmazlıq; **to have the ~ to say** ***smth.*** bir şeyi deməyə üzü olmaq; **to give ~** qabarmaq, söz qaytarmaq, kobud/qaba cavab vermək, ədəbsizlik etmək/göstərmək, kobudluq etmək; **2.** qabalıq, kobudluq, hörmətsizlik, özünə qürrələnmə / güvənmə / inanma / arxayın olma; *I'll have none of your cheek Mən sənin /sizin heç bir qabalığına / qabalığınıza dözə bilmərəm*;

◊ **~ brings success** həyasızlıq / sırtıqlıq qələbənin rəhnidir

**cheek²** [tʃi:k] *v* sırtıqlıq / həyasızlıq / abırsızlıq / utanmazlıq /ədəbsizlik etmək; həyasız/ abırsız/ ədəbsiz tərzdə hərəkət etmək; *He cheeked me O mənə qarşı kobudluq/ədəbsizlik/ həyasızlıq etdi; Pupils should never cheek their teachers Şagirdlər heç vaxt müəllimlərinə qarşı kobudluq / ədəbsizlik / qabalıq etməməlidir*

**cheek-bone** [ˈtʃi:kboun] *n anat.* almacıq sümüyü

**cheekly** [ˈtʃi:klɪ] *adv* sırtıqcasına, həyasızcasına, utanmazcasına, ədəbsizcəsinə; sırtıq-sırtıq, həyasız-həyasız, utanmaz-utanmaz

**cheekiness** [ˈtʃi:kɪnɪs] *n* həyasızlıq, abırsızlıq, ədəbsizlik, sırtıqlıq

**cheek-tooth** [ˈtʃi:ktu:θ] *n anat.* azı diş
**cheep**[1] [tʃi:p] *n* civilti, ciyilti
**cheep**[2] [tʃi:p] *v* civildəmək, ciyildəmək, cikkildəmək, cibbildəmək
**cheeper** [ˈtʃi:pəʳ] *n* **1.** çığırğan, ağlağan *(uşaq haq.)*; **2.** quş balası; ətcəbala
**cheepy** [ˈtʃi:pı] *adj* **1.** cırsəsli; çığırğan; **2.** ağlağan, qışqırıqçı *(uşaq haq.)*
**cheer**[1] [tʃıəʳ] *n* **1.** şadlıq, şənlik, nəşə; canlanma, canlandırma, sevinc, fərəh; **with good ~** səmimiyyətlə, hərarətlə, ürəkdən, qəlbdən, mehribanlıqla; **to meet with good ~** mehribanlıqla/səmimiyyətlə / hərarətlə qarşılamaq; **2.** ovqat, hal, əhval, əhvali-ruhiyyə; kef; sevinc, həvəs, könül; **to be of good/glad ~** yaxşı əhvali-ruhiyyədə / kefdə olmaq; **3.** qonaq etmə, qonaqlıq; yemək-içmək, yemək; **to make good ~** kef etmək, qonaqlıqda olmaq; **to feed on simple ~** sadə qidalanmaq; *The fewer the better cheer Yeyən nə qədər az olsa, yemək o qədər çox olar;* **4.** bəyənmə, ruhlandırma və ya təbrik nidası; *Cheers! Ura! Three cheers for our visitors! Yaşasın bizim qonaqlar! Qonaqlarımıza eşq olsun! The result was received with cheers and counter-cheers Nəticə razılıq və hiddət ifadə edən nidalarla qarşılandı; We could hear the cheers of the crowd 2 miles away from the football ground Biz camaatın alqış səslərini futbol meydançasından 2 mil məsafədə eşidə bilirdik;* **5.** bəyənmə, müdafiə; təsəlli, təskinlik; fərəh, sevinc; **words of ~** təsəlliverici sözlər
**cheer**[2] [tʃıəʳ] *v* **1.** alqışlamaq, əl çalmaq, salamlamaq; *The speaker was cheered loudly Natiqi ucadan alqışladılar;* **to ~ a hero** qəhrəmanı sürəkli alqışlarla qarşılamaq; *Everyone cheered the news that peace had come Sülh haqqındakı xəbəri hər bir adam sevinclə qarşıladı;* **2.** ürəkləndirmək, cəsarətləndirmək; ruhlandırmaq, ruh vermək, şövqə gətirmək *(fit verməklə, əl çalmaqla və s.); Everyone was cheered by the good news Yaxşı xəbər hamını ruhlandırdı;* **3.** *ovç.* çağırmaq, haraylamaq *(iti);* **4.** himayə / yardım etmək, ürək-dirək vermək; təsəlli/təskinlik vermək, ovundurmaq, sakit etmək; *Cheer yourself Cəsarətə gəlin! Cəsarətlənin! Your visit has cheered (up) the sick man Sənin / Sizin gəlişin /gəlişiniz xəstəyə ürək-dirək verdi; Cheer up! Ruhdan düşmə! / düşməyin;* **5.** şənləndirmək, ürəyini / könlünü açmaq, əyləndirmək; canlandırmaq, qüvvə vermək *(yemək, içmək haq.)*
**cheerer** [ˈtʃıərəʳ] *n* ruhlandıran, ürək-dirək verən *(adam);* təsəlli / təskinlik verən *(adam)*, sakit edən, sakitləşdirən *(adam)*
**cheerful** [ˈtʃıəfl] *adj* **1.** gümrah, qıvraq; ruhdan düşməyən, məyus olmayan; ümidini kəsməyən; sevincli, şad, şən; **a ~ face /man/boy, etc.** şad sifət/adam/oğlan və s.; **~ mood** şad / şən əhval; *He is always cheerful O həmişə şən əhval ruhiyyədə olur, Onun kefi həmişə yuxarı olur;* **2.** *məc.* ürəkaçan; könülöxşayan, ürəyəyatan; **a ~ room** ürəkaçan otaq; **~ colours** ürəyəyatan/ ürəkaçan rənglər; **a ~ day** ürəkaçan/ürəksevindirən gün; **~ conversation** ürəyəyatan söhbət
**cheerfully** [ˈtʃıəfəlı] *adv* **1.** şad, şən; ruh yüksəkliyi ilə, ruhdan düşməyərək / düşmədən; **2.** gümrahlıqla, qıvraqlıqla, həvəslə, razılıqla, ürəklə, ruh yüksəkliyi ilə; sevinə-sevinə, məmnuniyyətlə
**cheerio** [ˈtʃıərıou] *int. d.d. Salamat qal! / qalın!, Sağ ol / olun!, Salam olsun!*
**cheerless** [ˈtʃıəlıs] *adj* sevincsiz, fərəhsiz, məyus, qəmli, kədərli, hüznlü, qəmgin; tutqun, qaranlıq; **a ~ room** tutqun / qaranlıq otaq; **a ~ day** fərəhsiz/tutqun gün; **~ prospect** aydın olmayan gələcək; *I don't like going to work on such a cheerless day Mən belə tutqun gündə işə getməyi xoşlamıram*
**cheerly** [ˈtʃıəlı] *adv d.d.* qıvraq, gümrah; yorulmadan, ruh yüksəkliyi ilə, həvəslə, sevinclə
**cheers** [ˈtʃıəz] *inter* **1.** *Sənin/Sizin sağlığına/ sağlığınıza!;* **2.** *Sağ ol/olun! Xudahafiz!*
**cheery** [ˈtʃıərı] *adj d.d.* **1.** gümrah, diribaş, qıvraq; **2.** qızğın; çevik, zirək; **~ smile** sevincli / fərəhli təbəssüm; **3.** sevindirən, ürəkaçan, sevindirici; ruhlandırıcı, ruhlandıran, ürəkverici, ürəkləndirici, cəsarətverici; **~ cup** ruhlandırıcı/cəsarətverici qədəh
**cheese**[1] [tʃi:z] *n* **1.** pendir; **a ~** baş pendir; **to make ~** pendir tutmaq/hazırlamaq; **a very good ~** çox yaxşı pendir; *Cheese is made from milk of cows, sheep or goats Pendir inək, qoyun və ya keçi südündən tutulur / hazırlanır;* **green ~** təzə pendir; **2.** kəsmik, şor
**cheese**[2] [tʃi:z] *adj* pendir; **~ dairy/factory** pendir zavodu; **~ poison** *tib.* pendir zəhəri
**cheesecake** [ˈtʃi:zkeık] *n* **1.** tvorojnik *(kəsmik qoğalı);* **2.** *amer.* yarımçılpaq gözəl / qəşəng qız, yarımçılpaq nazənin; **3.** çılpaq baldırlar; **4.** tamahsılandırıcı/cəzbedici/cazibəli/ehtiras oyadan foto *(jurnallarda və s.)*
**cheesecloth** [ˈtʃi:zkləθ] *n* **1.** tənzif, cuna; **2.** paltar *(xüs. köynək)* tikmək üçün pambıq parça
**cheese-making** [ˈtʃi:z.meıkıŋ] *n* pendir tutma / istehsalı
**cheesemonger** [ˈtʃi:z.mʌŋgəʳ] *n* pendir satan, pendir alverçisi
**cheeseparing**[1] [ˈtʃi:z.peərıŋ] *n* **1.** pendir qabığı; **2.** *məc.* xəsislik, simiclik; dargözlük; xırdaçılıq; qəpiyə qənaət etmə; **3.** *pl* tullantı, tör-töküntü
**cheeseparing**[2] [ˈtʃi:z.peərıŋ] *adj* xəsis, simic, xırdaçı, qəpiyigüdən
**cheetah** [ˈtʃi:tə] *n zool.* gillik pişiyi, gepard *(ov pələngi)*
**chef** [ʃef] *n fr.* baş aşpaz, aşpazbaşı
**chef-d'oeuvre** [ʃeıˈdə:vr] *n fr.* şedevr, şah əsər



**chem** [kem] **chemical, chemist, chemistry** *sözlərinin qısa yazılış forması*
**chemical** [ˈkemıkəl] *adj* **1.** kimyəvi; **~ affinity** kimyəvi oxşayış; **~ symbol** kimyəvi rəmz/işarə; **~ decay** kimyəvi parçalanma; **~ agent** *hərb.* hərbi kimyəvi maddə; **~ projectile** *hərb.* kimyəvi mərmi; **~ war gases** kimyəvi silah, hərbi zəhərləyici maddə; *A chemical change takes place in paper when it burns Kağız yananda onda kimyəvi dəyişiklik baş verir;* **2.** *hərb.* qazdan qoruyucu, zəhərləyici maddələrdən qoruyucu; **~ defence / security** *hərb.* zəhərli maddələrdən qorunma
**chemically** [ˈkemıkəlı] *adv* kimyəvi baxımdan/cəhətdən; **to analyse ~** kimyəvi baxımdan təhlil etmək
**chemicals** [ˈkemıkəlz] *n pl* kimyəvi preparatlar *(dərmanlar)*
**chemise** [ʃəˈmı:z] *n* qadın köynəyi
**chemist** [ˈkemıst] *n* **1.** kimyaçı; **2.** aptekçi *(aptek sahibi)*, əczaçı; **~'s** aptek, əczaxana; **3.** *arx.* əlkimyagər *(yalançı kimya ilə məşğul olan adam)*
**chemistry** [ˈkemıstrı] *n* **1.** kimya; **organic ~** üzvi kimya; **inorganic ~** qeyri-üzvi kimya; **applied ~** tətbiqi kimya; **atom / nuclear ~** nüvə kimyası; **2.** *arx.* əlkimya, yalançı kimya
**chemotherapy** [.keməuˈθerəpı] *n tib.* kimyəvi üsulla müalicə
**chenar** [ˈtʃına:ʳ] *n bot.* çinar
**cheque** [ˈtʃek] *n mal.* çek; **~ to bearer, bearer ~** təqdim edənə verilən çek; **~ to order, order ~** order çeki; *I'd like to pay by cheque, please, rather than in cash Mümkünsə, mən istərdim ki, nağd pulla deyil, çek vasitəsilə ödəyim;* **to ~ out** çek vasitəsilə almaq
**cheque-book** [ˈtʃekbuk] *n* çek kitabı
**chequered** [ˈtʃekəd] *adj* **1.** dama-dama, xana-xana; ala-bəzək, ala-bula, rəngbərəng, əlvan; **2.** şahmatvarı, şahmat qaydası ilə; **3.** müxtəlif, çeşidli; dəyişən; **~ light and shade** dəyişən işıq və kölgə *(rəsmdə);* **~ fortune** dəyişkən tale / xoşbəxtlik
**chequers** [ˈtʃekəz] *n* **1.** şahmat taxtası; **2.** dama-dama parça, şotlandka *(iri xanalı parça növü)*
**cherish** [ˈtʃerıʃ] *v* **1.** oxşamaq, əziz tutmaq; nazlamaq; *He cherished the memory of his dead wife O, mərhum arvadının xatirəsini əziz tuturdu;* **2.** *məc.* bəsləmək; **to ~ hopes** ümid bəsləmək; **to ~ a hatred** nifrət / ədavət bəsləmək; **to ~ a serpent / a snake in *one's* bosom** qoynunda ilan bəsləmək; **3.** unutmamaq; saxlamaq; **to ~ the memory of *smb./smth.*** bir kəsi / şeyi xatirində saxlamaq; *The girl still cherished an affection for him Qızın qəlbində hələ də ona qarşı məhəbbət vardı;* **4.** yüksək qiymətləndirmək; qədrini bilmək, üstündə əsmək; *He was a man who cherished his friends O, dostlarının qədrini bilən adam idi;* **to ~ ideals of freedom and independence** azadlıq və müstəqillik ideallarını yüksək qiymətləndirmək; **to ~ a just and lasting peace** ədalətli və möhkəm sülhün qədrini bilmək, ədalətli və möhkəm sülhü göz bəbəyi kimi qorumaq; **5.** saxlamağa çalışmaq, yapışmaq; üstün tutmaq; **to ~ fame** şöhrəti/adı saxlamağa çalışmaq; *He cherishes fame O, şöhrəti hər şeydən üstün tutur;* **6.** əzizləmək, nazını çəkmək, qayğıkeşliklə böyütmək *(uşağı); She cherishes her children O, uşaqlarını qayğıkeşliklə böyüdür;* **7.** *d.d.* nəvaziş göstərmək, sevmək; *The old man cherished the girl as if she were his daughter Qoca kişi qıza elə nəvaziş göstərirdi ki, elə bil öz qızı idi;* **8.** *arx.* mehribanlıqla/gülər üzlə/səmimiyyətlə qəbul etmək *(qonağı)*
**cherishingly** [ˈtʃerıʃıŋlı] *adv* qayğıkeşliklə, qayğı ilə; sevgilə, şəfqətlə, nəvazişlə, sevə-sevə
**cherry**[1] [ˈtʃerı] *n* **1.** *bot.* albalı; albalı ağacı; **sweet ~** şirin gilas, şpanka; **to sell cherries** albalı satmaq; **2.** albalı rəngi, tünd qırmızı;
◊ **the whole tree or not a ~** ya hamısı ya da heç nə
**cherry**[2] [ˈtʃerı] *adj* **1.** albalı; **~ orchard** albalı bağı; **~ jam** albalı mürəbbəsi; **2.** albalı rəngli; tünd-qırmızı; **~ silk dress** albalı rəngli ipək don; **~ lips** albalı rəngli dodaqlar; **~ lipstick** albalı rəngli / tünd-qırmızı pomada
**cherry-blossom** [ˈtʃerı.bləsəm] *n* albalı çiçəyi; albalı rəngdə çiçək
**cherry-stone** [ˈtʃerıstoun] *n* albalı çəyirdəyi
**cherry-tree** [ˈtʃerıtrı:] *n bot.* albalı ağacı
**cherry-wine** [ˈtʃerıwaın] *n* albalı şərabı
**chess**[1] [tʃes] *n* şahmat *(oyun);* **to play ~** şahmat oynamaq
**chess**[2] [tʃes] *adj* şahmat; **~ piece** şahmat fiquru; **~ champion** şahmat üzrə çempion; **~ theory** şahmat oyununun nəzəriyyəsi; **~ tournament** şahmat yarışı; *Let's play a game of chess Gəlin bir əl/partiya şahmat oynayaq*
**chessboard** [ˈtʃesbɔ:d] *n* şahmat taxtası
**chess-clock** [ˈtʃesklɔk] *n* şahmat saatı *(şahmat oynayarkən istifadə edilən)*
**chessman** [ˈtʃesmən] *n (pl* **-men** [-mən]) şahmat fiquru; **ivory chessmen** fil sümüyündən hazırlanmış şahmat fiqurları
**chessplayer** [ˈtʃes.pleıəʳ] *n* şahmatçı, şahmatist, şahmat oynayan
**chest**[1] [tʃest] *n* **1.** *anat.* döş qəfəsi; döş, sinə; **2.** qutu, yeşik; sandıq; **~ of drawers** komod *(siyirməli paltar şkafı);* **medicine ~** dərman qutusu *(evdə);* **carpenter's ~** dülgər qutusu *(içində müxtəlif alətlər saxlanılan);* **surgeon's ~** cərrah qutusu *(içərisində cərraha lazım olan müxtəlif alətlər yığılan);* **linen ~** dəyişək sandığı / şkafı/komodu; **hope ~** *zaraf.* cehiz sandığı *(cehiz yığılan);* **3.** qutu, yeşik *(ölçü vahidi);* **a ~ of tea / cigarette / soap *etc.*** bir yeşik çay / siqaret / sa-

bun və s.;

◊ **to get** *smth.* **off** *one's* ~ ürəyini boşaltmaq, bir şeyi səmimiyyətlə etiraf etmək

**chest**[2] [tʃest] *adj* döş, sinə; ~ **pain** döş / sinə ağrısı; ~ **cold** bronxit; ~ **wall** *anat.* döş qəfəsinin divarı

**chest**[3] [tʃest] *v* **1.** qutuya / sandığa qoymaq / yığmaq; **2.** tabuta / qəbirə qoymaq

**-chested** [tʃestɪd]: *mürəkkəb sözlərin komponenti;* deep-**chested** batıq sinə; full-**chested** iridöşlü; dolğundöşlü *(qad. haq.)*; flat-**chested** yastı döşlü/yastısinəli; *She was flat-chested O, yastı döşlü/yastısinəli idi*

**chesterfield** ['tʃestəfi:ld] *n* **1.** məxmər yaxalığı olan beldən yığılmış palto; **2.** böyük yumşaq divan

**chest-foundering** ['tʃest'faundərɪŋ] *n bayt.* xəfənək *(at və başqa heyvanlarda ciyər xəstəliyi)*; təngnəfəslik; tövşümə

**chestnut**[1] ['tʃesnʌt] *n* **1.** *bot.* şabalıd; şabalıd ağacı *(oduncaq)*; **2.** şabalıdı rəng; **3.** kəhər at; **4.** *anat.* buxovluq oynağı *(heyvanların ayağında dırnaqüstü oynaq)*;

◊ **to pull** *smb.'s* ~**s out of the fire** ≅ ilanı Seyid Əhməd əli ilə tutmaq

**chestnut**[2] ['tʃesnʌt] *adj* **1.** şabalıd; ~ **tree** şabalıd ağacı; **2.** şabalıdı, şabalıdı rəng; **3.** kəhər *(at haq.)*; **4.** xurmayı, açıq-şabalıdı *(saç, tük haq.)*, xurmayı / şabalıdı saçlı *(adam haq.)*; ~ **head** şabalıdı / xurmayı saçlı qadın / qız

**chesty** ['tʃestɪ] *adj* **1.** genişsinəli; **2.** hündürdöşlü, iridöşlü, şişmandöşlü *(qadın haq.)*; **3.** özünə qürrələnən/inanan/arxayın olan; lovğa, özünü öyən; **4.** ciyəri zəif, vərəmli, vərəm xəstəliyi olan; **5.** sinədən gələn; ~ **cough** sinədən gələn öskürək

**cheval-glass** [ʃə'vælglɑ:s] *n* hərəkət edən çərçivəli böyük / iri güzgü

**chew**[1] [tʃu:] *v* **1.** çeynəmək; gövşəmək; *You must chew your food well before you swallow it Udmazdan əvvəl sən / siz yeməyini/yeməyinizi yaxşı-yaxşı çeynəməlisən / çeynəməlisiniz;* **2.** düşünmək, fikirləşmək, ətraflı düşünmək/fikirləşmək, götür-qoy etmək; niyyətində / fikrində / qəsdində olmaq; **to ~ revenge** intiqam / qisas almaq haqqında düşünmək;

◊ **to ~ the cud 1)** saqqız çeynəmək; **2)** eyni fikri dəfələrlə təkrar etmək; **to ~ the cud for a time** bir az fikirləşmək / düşünmək / götür-qoy etmək; **to bite off more than one can ~ 1)** gücü çatmayan işdən yapışmaq; **2)** edə biləcəyindən artıq söz vermək; **to ~ the rag** *jarq.* donquldanmaq, deyinmək; mırtıldamaq, söylənmək; şikayət etmək, şikayətlənmək, narazılıq etmək, gileylənmək

**chewing** ['tʃu:ɪŋ] *n* çeynəmə; gövşəmə

**chewing-gum** ['tʃu:ɪŋgʌm] *n* saqqız

**chew out** ['tʃu:aut] *v amer.* danlamaq; *The teacher chewed me out for being late Gecikdiyim üçün / Gecikdiyimə görə müəllim məni danladı*

**chew over** ['tʃu:ouvə'] *v* fikirləşmək, götür-qoy etmək; *I'll chew the question over for a few days and let you know my opinion Mən məsələni bir-iki gün götür-qoy edib öz fikrimi sənə/sizə bildirəcəm*

**chi** [kaɪ] *n yunan əlifbasının 22-ci hərfi*

**chic**[1] [ʃi:k] *n d.d.* şıq, zahiri bəzək / zinət / dəbdəbə, qəşənglik, zəriflik

**chic**[2] [ʃi:k] *adj d.d.* qəşəng, zərif, təsir bağışlayan, gözəl; *This is a chic hat Bu, gözəl papaqdır;* ~ **appearance** qəşəng / gözəl görkəm

**chicly** ['ʃi:klɪ] *adv* qəşəng, gözəl, zərif; nəfis; ~ **dressed** zərif/gözəl/qəşəng geyinmiş

**chick** [tʃɪk] *n* **1.** cücə, çolpa; **2.** quş balası; **3.** *amer. hərb. jarq.* qırıcı təyyarə / gəmi

**chicken**[1] ['tʃɪkɪn] *n* **1.** çolpa; **2.** beçə, fərə; **3.** toyuq əti; **spring** ~ yaz çolpası *(yemək)*; *I don't like chicken Mən toyuq əti xoşlamıram;* **4.** quş balası; **5.** cavan *(oğlan)*; tüklənməmiş quş balası, ətcəbala; **spring** ~ *jarq.* təcrübəsiz cavan, sadəlövh /ürəyiaçıq qız; **6.** qorxaq, aciz / bacarıqsız adam

**chicken**[2] ['tʃɪkɪn] *adj:* ~ **coop** toyuq hini; ~ **house** *amer.* toyuq hini / damı; ~ **farming** *amer.* quşçuluq; toyuqçuluq təsərrüfatı; ~ **feed** toyuq yemi;

◊ **to count** *one's* ~**s before they are hatched** cücəni yumurtadan çıxmamış saymaq; *Don't count your chickens before they are hatched at. söz. Cücəni payızda sayarlar*

**chicken-cholera** ['tʃɪkɪn.kɔlərə] *n bayt.* toyuq vəbası

**chicken-heart** ['tʃɪkɪnha:t] *n* qorxaqlıq, ürəksizlik, cəsarətsizlik; qorxaq, ağciyər *(adam)*

**chicken-hearted** ['tʃɪkɪn'ha:tɪd] *adj* qorxaq, ürəksiz, cəsarətsiz, ağciyər

**chicken-liver** ['tʃɪkɪn.lɪvə'] *n* = **chicken-heart**

**chicken-livered** ['tʃɪkɪn.lɪvəd] *adj* = **chicken-hearted**

**chicken-meat** ['tʃɪkɪnmi:t] *n* toyuq yemi

**chicken-pox** ['tʃɪkɪnpɔks] *n tib.* toyuq çiçəyi, suçiçəyi

**chicken's meat** ['tʃɪkɪnz'mi:t] *n* = **chicken-meat**

**chickery** ['tʃɪkərɪ] *n* cücə damı, cücə hini

**chickling** ['tʃɪklɪŋ] *n* yumurtadan yenicə çıxmış cücə, ətcəbala

**chid** [tʃɪd] **to chide** *felinin pt, pp forması*

**chidden** ['tʃɪdn] **to chide** *felinin p.t. forması*

**chide** [tʃaɪd] *v (pt* **chid**, *yaxud* **chided**, *pp* **chid** *yaxud* **chidden)** **1.** danlamaq, məzəmmət etmək, təqsirləndirmək, qınamaq; donquldanmaq, deyinmək , söylənmək; **to ~ a pupil for being lazy** tənbəl olduğuna görə şagirdi danlamaq, tənbəlliyə görə şagirdi məzəmmət etmək; **2.** vıyıldamaq, uğuldamaq, guruldamaq *(külək, dəniz haq.)*

**chief**[1] [tʃi:f] *n* **1.** rəhbər; lider; rəis, şef; müdir; sədr, direktor; ~ **of a library** kitabxana müdiri; **Republican party** ~**s** respublikaçılar partiyasının rəhbərləri / liderləri; ~ **of police** polis rəisi; ~ **of stuff** *hərb.* ştab rəisi; **a ~ of court** məhkəmə sədri; **2.** başçı *(qəbilənin, klanın)*; hökmdar, əmir, padşah; **Red Indian** ~ hindu tayfasının başçısı; **robber** ~ quldurbaşı, quldurların başçısı;

◊ **in** ~ əsasən, başlıca olaraq



**chief**[2] [tʃi:f] *adj* **1.** baş, böyük; ~ **editor** baş redaktor; ~ **engineer 1)** baş mühəndis; **2)** baş mexanik; ~ **librarian** kitabxana müdiri; ~ **officer** *dən.* baş köməkçi; ~ **surgeon** *hərb.* tibbi xidmət rəisi; ~ **nurse** baş şəfqət bacısı; **2.** əsas, vacib, başlıca; **the ~ problem/question,** *etc.* başlıca problem / məsələ və s.; *The chief thing to discuss is this Əsas / Başlıca müzakirə edilməli məsələ budur;* **the ~ thing to do** görülməli başlıca iş; **the ~ rivers in Azerbaijan** Azərbaycanın əsas çayları; *The chief news is printed on the next page Əsas xəbər o biri səhifədə çap olunub/edilib;* ~ **business** əsas məşğuliyyət/iş; *Smoking is one of the chief causes of lung cancer Ciyər xərçənginin başlıca səbəblərindən biri papiros çəkməkdir;*

◊ ~ **mourner** rəhmətə gedənin ən yaxın qohumu / dostu

**chiefly**[1] ['tʃi:flɪ] *adj* rəhbərə/başçıya yaraşan, rəhbərə / başçıya məxsus olan

**chiefly**[2] ['tʃi:flɪ] *adv* əsasən, başlıca olaraq; *They eat chiefly fish Onlar əksərən/əsasən balıq yeyirlər; Bread is chiefly made of flour Çörək əsasən undan hazırlanır*

**chieftain** ['tʃi:ftən] *n* **1.** başçı *(qəbilə başçısı)*; **2.** *şair.* sərkərdə, qoşun başçısı; **3.** ataman, quldurbaşı, dəstəbaşı

**chieftaincy** ['tʃi:ftənsɪ] *n* **1.** başçı / ataman səlahiyyəti/ixtiyarı; **2.** başçılıq, rəhbərlik

**chieftainry** ['tʃi:ftənrɪ] *n top.i* **1.** başçılar *(qəbilələrin)*; **2.** hakimiyyət, səlahiyyət, başçının statusu

**chieftainship** ['tʃi:ftənʃɪp] *n* = **chieftaincy**

**chiff-chaff** ['tʃɪftʃæf] *n zool.* ötməquşu

**chiffon**[1] ['ʃɪfɔn] *n toxuc.* şifon *(nazik ipək və ya pambıq parça)*

**chiffon**[2] ['ʃɪfɔn] *adj* şifon; ~ **blouse** şifon kofta

**chiffonier** [.ʃɪfə'nɪə'] *n* şifoner *(paltar şkafı)*

**chignon** [ʃɪ:'njɔ:ŋ] *n fr.* şinyon, qadın pariki

**child** [tʃaɪld] *n (pl* **children**) uşaq, bala, çağa, körpə; **male/female** ~ yeni doğulmuş oğlan / qız uşağı; **mother and** ~ ana və uşaq; **to be with** ~ hamilə olmaq, uşağa qalmaq; **four months gone with** ~ hamiləliyin beşinci ayı; **from a** ~ uşaqlıqdan; **children and adults** uşaqlar və böyüklər; *What a sweet child! Nə qəşəng / şirin uşaqdır!; She is an obedient child O, itaətkar / sözəbaxan uşaqdır;* **young** ~ döş uşağı; **little children** balaca / kiçik uşaqlar; **high-school children** yuxarı sinif uşaqları / məktəbliləri; *You speak as a child Sən / Siz uşaq kimi danışırsan/danışırsınız;* **children's hospital** uşaq xəstəxanası; **children's service** *tib.* uşaq şöbəsi *(xəstəxanada)*; **Children and parents** uşaqlar və valideynlər; **an only** ~ yeganə uşaq; **children's allowance** uşaqlara verilən müavinət;

◊ ~**'s play** uşaq oyuncağı; boş iş, çox asan məsələ; *It's child's play to me Bu mənim üçün uşaq oyuncağıdır (yəni çox asan işdir); Children should be seen, and not heard Böyüklər olan yerdə uşaqlar danışmamalıdır*

**childbearing** ['tʃaɪld.beərɪŋ] *n* **1.** uşaq doğma; doğum; *The woman was too old for childbearing when she married Qadın ərə gedəndə uşaq doğmaq üçün çox yaşlı idi;* **2.** hamiləlik, bala vermə

**childbed** ['tʃaɪldbed] *n* **1.** doğma, doğum, doğuş; **to die in** ~ doğuş zamanı ölmək; **2.** *tib.* doğumdan /doğuşdan sonrakı dövr

**child-birth** ['tʃaɪldbə:θ] *n* **1.** doğma, doğuş, doğum; **to die in** ~ doğuş zamanı ölmək; **2.** doğum sayı

**childhood**[1] ['tʃaɪldhud] *n* **1.** uşaqlıq, uşaqlıq çağı / dövrü; **to spend** *one's* ~ **in the village** uşaqlığını kənddə keçirmək; *I spent my childhood in the village Mən uşaqlığımı kənddə keçirdim; I have known him from my childhood Mən onu uşaqlığımdan tanıyıram;* ~ **of the world** *şair.* bəşəriyyətin ilk çağı / başlanğıcı; **2.** *arx.* oğulun və ya qızın statusu; **bond of** ~ oğulun və ya qızın borcu

**childhood**[2] ['tʃaɪldhud] *adj* uşaqlıq, uşaq; ~ **friend** uşaqlıq dostu; ~ **disease** uşaq xəstəliyi; ~ **reading** uşaq ədəbiyyatı

**childish** ['tʃaɪldɪʃ] *adj* uşaq, uşaqlıq edən, özünü uşaq kimi aparan; sadəlövh; kamala çatmamış; ~ **argument** sadəlövh dəlil / arqument; ~ **behaviour** uşaq hərəkəti; ~ **mind** kamala çatmamış / inkişaf etməmiş ağıl; ~ **weakness** kişiyə yaraşmayan zəiflik; ~ **sports** uşaq oyunları / idmanı; ~ **voice** uşaq səsi; *The girl spoke in a childish voice Qız uşaq səsi ilə danışdı; To believe this would be childish Buna inanmaq uşaqlıq olardı*

**childishly** ['tʃaɪldɪʃlɪ] *adv* uşaq kimi, uşağa bənzər, uşaqcasına; **to act** ~ uşaq kimi / uşaqcasına hərəkət etmək

**childishness** ['tʃaɪldɪʃnɪs] *n* uşaqlıq, sadəlik, sadəlövhlük

**childless** ['tʃaɪldlɪs] *adj* uşaqsız, sonsuz, uşağı olmayan, övladsız; **a ~ family** uşaqsız / övladsız ailə

**childlessness** ['tʃaɪldlɪsnɪs] *n* uşaqsızlıq, sonsuzluq, övladsızlıq, övladı/uşağı olmama

**childlike** ['tʃaɪldlaɪk] *adj* **1.** günahsız, təmiz, səmimi, sadə, uşaq kimi/uşaqcasına inanan; **2.** oğul, oğulluq, qız, qızlıq; ~ **duty** oğul/oğulluq borcu, qız/qızlıq borcu, uşaqların valideynləri qarşısında borcu

**childly** ['tʃaɪldlɪ] *adj* **1.** uşaq, körpə, çağa; **2.**

uşaqlıq edən, özünü uşaq kimi aparan; sadəlövh, sadə, sadədil
**children** [ˈtʃɪldrən] **child** *isminin cəm forması*
**child-rites** [ˈtʃaɪldraɪts] *n pl kils.* xaç suyuna çəkmə mərasimi *(uşağı)*
**childship** [ˈtʃaɪldʃɪp] *n* 1. qızlıq/oğulluq statusu; 2. oğulluğa / qızlığa götürmə
**Chilean**[1] [ˈtʃɪlɪən] *n* çilili *(Çili əhalisindən olan adam)*; 2. ispan dilinin Çili variantı
**Chilean**[2] [ˈtʃɪlɪən] *adj* Çili
**chill**[1] [tʃɪl] *n* 1. soyuq, soyuq hava; şaxta; **the ~s of night** gecənin soyuğu / şaxtası; *There was a chill in the air this morning Bu səhər havada (bir) şaxta vardı;* 2. soyuqluq, soyutma, soyudulma; **to take the ~ off** bir az isitmək/qızdırmaq; 3. soyuqdəymə, soyuqlama; **to catch a ~** soyuqlamaq, özünü soyuğa vermək, soyuq dəymək; 4. soyuqluq, soyuq münasibət; 5. ruhdan salıcı / əl-qolunu bağlayıcı təsir; ümidi kəsilmə /boşa çıxma, məyus olma, ümidsizlik; **to cast / to throw a ~** əlini soyutmaq; həvəsdən/ruhdan salmaq; kədərləndirmək, qəmləndirmək, ovqatını təlx etmək, əhvalını pozmaq/təlx etmək, qanını qaraltmaq; *The bad news cast a chill over the gathering Pis xəbər toplanışdakıların ovqatını təlx etdi/qanını qaraltdı;* 6. *tex.* sulama, su vermə *(polada)*
**chill**[2] [tʃɪl] *adj* 1. soyuq, buz kimi; **~ breeze** soyuq / buz kimi külək; 2. soyuq, sərin; **~ welcome** soyuq qəbul; 3. hissiz, sərt, soyuq; **~ box** soyuducu
**chill**[3] [tʃɪl] *v* soyutmaq; *I want this wine to chill Mən bu şərabı soyutmaq istəyirəm; It chills my blood Bu mənim qanımı dondurur*
**chilled** [tʃɪld] *adj* soyudulmuş; **~ wine/beer / meat** soyudulmuş şərab / pivə / ət
**chilli** [ˈtʃɪlɪ] *n* 1. *bot.* döyülməmiş qırmızı bibər; 2. döyülmüş qırmızı bibər
**chilliness** [tʃɪlɪnɪs] *n* 1. soyuqluq, sərinlik; 2. quruluq, soyuqluq *(münasibət və s. haq.)*
**chilling-room** [ˈtʃɪlɪŋrum] *n* dondurucu kamera
**chillness** [tʃɪlnɪs] *n* 1. soyuqluq; pislik, pozğunluq *(havada)*; 2. sərinlik, ayaz
**chilly**[1] [ˈtʃɪlɪ] *adj* 1. soyuq; sərin; pis, korlanmış; nəm, yağmurlu *(hava haq.)*; **a ~ room** soyuq otaq; **~ morning** yağmurlu səhər; *It is getting chilly Sərinləşir, Soyuqlaşır;* 2. tez üşüyən, soyuğa davamsız; **to feel ~** üşümək, titrəmək, əsmək *(soyuqdan)*; **~ sensation** *tib.* titrəmə, üşütmə, uçunma; 3. quru, soyuq; *The king was given a chilly welcome when he arrived on the island Kral adaya təşrif gətirəndə onu soyuq qarşıladılar;* **~ smile** soyuq təbəssüm; **to be ~ to smb.** bir kəsə soyuq/laqeyd münasibət bəsləmək
**chilly**[2] [ˈtʃɪlɪ] *adv* 1. üşüyə-üşüyə, soyuqdan əsə-əsə, büzüşərək; 2. soyuq, qaşqabaqlı
**chime**[1] [tʃaɪm] *n* 1. zəng dəsti / komplekti; qüllə saatı; 2. zəng səsi; qüllə saatının səsi; *Listen to the chimes of the church bells Kilsə zənglərinin səsinə qulaq as/ asın;* 3. saatın vurması/çalması; *The chime of the clock woke him up Saatın vurması onu yuxudan ayıltdı;* 4. ahəng, harmoniya; uyğunluq; **in ~** ...müvafiq olaraq, ...uyğun olaraq
**chime**[2] [tʃaɪm] *v* 1. hava çalmaq *(zəng/qüllə saatı vasitəsilə)*; zəng çalmaq, vurmaq; *The bells are chiming Kilsə zəngləri çalınır;* 2. vurmaq; *The clock chimed midnight Saat gecəyarısını vurdu;* 3. yeknəsəq olaraq / surətdə təkrar etmək; **to ~ verse** şeri yeknəsək surətdə təkrar etmək; 4. uyğun / müvafiq / münasib olmaq, uyğun gəlmək, həmahəng olmaq; **to ~ *(in)* with *smb.'s* idea** bir kəsin fikrinə / ideyasına uyğun gəlmək; *I think your plans will chime in with mine Mən belə hesab edirəm ki, / düşünürəm ki, sənin / sizin planın/planınız mənimki ilə uyğun olacaq / mənim planıma uyğun gələcək;*
◊ **to ~ in with** -a, -ə qoşulmaq; **to ~ in with the laughter** ümumi gülüşə qoşulmaq
**chimer** [ˈtʃaɪməʳ] *n* zəngçi, zəngçalan *(kilsədə)*
**chimney** [ˈtʃɪmnɪ] *n* baca; dudkeş, boru *(tüstü çəkən)*; **factory ~s** fabrika bacaları
**chimney-board** [ˈtʃɪmnɪbɔ:d] *n* yayda bacanı örtmək üçün lövhə
**chimney-cap** [ˈtʃɪmnɪkæp] *n* tüstü borusunun qapağı
**chimney-corner** [ˈtʃɪmnɪˌkɔ:nəʳ] *n* 1. buxarının yaxınlığında/qabağında yer; 2. rahat isti yer
**chimney-stack** [ˈtʃɪmnɪstæk] *n* baca, dudkeş
**chimney-stalk** [ˈtʃɪmnɪstɔ:k] *n* fabrik-zavod bacası / borusu *(tüstü çəkmək üçün)*
**chimney-swallow** [ˈtʃɪmnɪˈswɔlou] *n* kənd qaranquşu
**chimney-sweep** [ˈtʃɪmnɪswi:p] *n* bacatəmizləyən
**chimney-sweeper** [ˈtʃɪmnɪˌswi:pəʳ] *n* = **chimney-sweep**
**chimp** [tʃɪmp] *n d.d.* şimpanze
**chimpanzee** [ˌtʃɪmpənˈzi:] *n zool.* şimpanze
**chin**[1] [tʃɪn] *n* çənə; **double ~** buxaq;
◊ **up to the ~** ≅ boğaza qədər; *Keep your chin up ≅ Başını / Başınızı dik tut / tutun!* **to take things on the ~** ruhdan / həvəsdən düşməmək; **to hold up by the ~** kömək etmək, tərəfdar olmaq
**chin**[2] [tʃɪn] *v* 1. çənəsinə yaxınlaşdırmaq; çənəsi ilə tutmaq *(skripkanı və s.)*; 2. *amer jarq.* çənə vurmaq, çərənləmək, naqqallıq/boşboğazlıq etmək, boş-boş danışmaq; 3.: **to ~ oneself up** çənəyə qədər dartınıb qalxmaq *(gimnastika)*
**china**[1] [ˈtʃaɪnə] *n* 1. farfor, çini; 2. farfor məmulatı, çini qab;
◊ **to break ~** vəlvələ/çaxnaşma salmaq, həngamə açmaq / qoparmaq
**China**[2] [ˈtʃaɪnə] *adj* I Çin; **~ tea** çin çayı
**china** [ˈtʃaɪnə] *adj* II farfor, çini; **~ vase** farfor/çini vaza; **~ shop** farfor/çini qablar mağazası
**china-closet** [ˈtʃaɪnəˌklɔzɪt] *n* bufet; qab şkafı
**china-crape** [ˈtʃaɪnəkreɪp] *n arx.* krepdeşin *(ipək parça növü)*



**china-grass** [ˈtʃaɪnəgra:s] *n bot.* rami *(isti ölkələrdə bitən lifli bitki)*
**chinawoman** [ˈtʃaɪnəˌwumən] *n (pl* **-women** [-ˌwɪmɪn] çinli qadın
**chine**[1] [tʃaɪn] *n* 1. bel sütunu *(heyvanlarda)*; 2. *aşp.* can əti; sümüyü çıxarılmış ət parçası
**chine**[2] [tʃaɪn] *v* 1. can ətini kəsmək; 2. bel sümüyünü sındırmaq; *I'll chine the villain Bu əclafın/yaramazın belini sındıracam*
**Chinese**[1] [ˈtʃaɪˈni:z] *n (Cəmdə dəyişmir)* 1. çinli; **the ~** *top.i.* çinlilər; 2. Çin dili; **to speak ~** Çin dilində danışmaq, çincə danışmaq
**Chinese**[2] [ˈtʃaɪˈni:z] *adj* Çin; **~ wall** Çin səddi; **~ paper** Çin kağızı *(bambukdan hazırlanmış)*; **~ red** tünd-qırmızı;
◊ **~ puzzle** dolaşıq iş/məsələ, mürəkkəb / çox çətin tapşırıq
**chink**[1] [tʃɪŋk] *n* I yarıq, çatlaq, çat; *The boy watched the girls through a chink in the wall Oğlan divarın yarığından qızlara tamaşa edirdi*
**chink** [tʃɪŋk] *n* II 1. zəng səsi; zınqıltı; cingilti *(stəkan, dəmir pul və s. səsi)*; 2. cırıldama *(cırcırama haq.)*; 3. sikkə, metal pul; nağd pul; **a man of ~** dövlətli / varlı / zəngin adam
**chink** [tʃɪŋk] *n* III bərk / coşğun öskürək tutmadan və ya gülməkdən uğunma
**chink**[2] [tʃɪŋk] *v* I 1. suvaqlamaq, malalamaq; yarığı/çatlağı tutmaq; *He chinked the hole in the wall with clay O, divardakı deşiyi / yarığı gillə tutdu;* 2. çat-çat olmaq, çatla örtülmək, çatlamaq
**chink** [tʃɪŋk] *v* II cingildəmək *(stəkan, dəmir pul və s.)*
**chink** [tʃɪŋk] *v* III coşğun bir halda öskürmək və ya gülməkdən uğunmaq
**chinky** [ˈtʃɪŋkɪ] *adj* yarıq-yarıq, çatlaq-çatlaq, çatlaqla / yarıqla örtülü olan; kəsik-kəsik/doğram-doğram / tikə-tikə edilmiş; çatlamış, çat-çat olmuş
**chinless** [ˈtʃɪnlɪs] *adj* 1. çənəsiz, çənəsi zəif inkişaf etmiş; 2. xaraktersiz, iradəsiz, zəif iradəli, iradəsi zəif
**chinstrap** [ˈtʃɪnstræp] *n* çənəaltı qayış / lent *(papağı başda saxlamaq üçün)*
**chintz** [tʃɪnts] *n toxuc.* mumlanmış parça; mebel çiti, mebelə üz çəkmək üçün çit / parça
**chip**[1] [tʃɪp] *n* I 1. talaşa, tilişkə; 2. *(əsasən cəmdə)* yonqar; 3. ağac lığı, alt qabıq, lif; çətənə/kətan telləri *(zənbil, papaq və s. hörmək üçün)*; 4. qırıntı, parça, qırıq, qəlpə *(daşın, şüşənin)*; qopardılmış parça; 5. zədə, qüsur, nöqsan; qopardılmış parçanın yeri; çopur yeri, çopurluq; kələ-kötürlük; dişək; **a ~ in the edge of a plate** boşqabın qırağında kələ-kötürlük; 6. *pl* çınqıl, qırma daş/kərpic; 7. nazik dilim/fal/tikə *(alma, kartof və s. haq.)*; **orange ~s** şəkərli portağal dilimləri; 8. *pl* kartof dilimi *(nazik-nazik kəsilib qızardılmış kartof)*; **fish and ~s** balıq və nazik-nazik kəsilib qızardılmış kartof; 9. fişka *(müxtəlif oyunlarda işlənən daş, marka və s.)*; 10. yararsız / dəyərsiz şey, dadsız şey; **to roast to a ~** qızardıb yandırmaq/ yararsız hala salmaq; 11. *pl* tullantı; *(kinoplyonka və s.)*; 12. *pl d.d.* pul, dəmir pul; **in the ~s** *jarq.* dövlətli, varlı *(adam)*; 13. *pl amer.* təzək;
◊ **dry as a ~** quru, maraqsız, maraq doğurmayan; **a ~ in a pottage pot** nə xeyir, nə ziyan, nə yaxşı, nə yaman; **to cash in *one's* ~s** *amer. d.d.* 1) hesablaşmaq, haqq-hesab çəkib üzülüşmək; 2) özünü öldürmək, intihar etmək; **when the ~s are down...** 1) həlledici an gəldikdə/çatdıqda...; 2) *hərb.* hərbi əməliyyat başlananda...; **to have / to wear a ~ on *one's* shoulder** dalaşmağa hazır olmaq/bəhanə axtarmaq, meydan oxumaq; **to knock a ~ from / off *smb.'s* shoulder** bir kəslə davaya girişmək / dava etmək; *Such carpenter, such chips at. söz. ≅ Kor atın kor nalbəndi olar; ≅ Mal sahibinə oxşar; I don't care a chip Mənim üçün fərqi yoxdur*
**chip** [tʃɪp] *n* II 1. badalaq *(güləşdə)*; 2. dalaşma, vuruşma, dava, küsüşmə; küsülülük
**chip**[2] [tʃɪp] *v* I 1. yonmaq, rəndələmək; 2. doğramaq, yarmaq, parçalamaq; *I have chipped potatoes Mən kartofu doğramışam;* 3. parçalamaq, yarmaq *(odunu)*; 4. çapmaq, sındırmaq *(buzu və s.)*; 5. xırdalamaq, parçalamaq, doğramaq *(daşı)*; 6. oymaq, deşmək, dəlmək; 7. bölünmək, parçalanmaq, qırılmaq; *This rock chips easily Bu qaya asanlıqla parçalanır / qırılır;* 8. çapılmaq, sındırılmaq, qopardılmaq; 9. kənarını sındırmaq *(qabın və s.)*; kələ-kötür etmək; *These plates chip if you are not careful Sən / Siz ehtiyatlı olmasan / olmasanız bu boşqabların kənarları sınacaq; I've chipped a piece off your table, I'm sorry Üzr istəyirəm, sənin / sizin stolunun/stolunuzun qırağını qopartmışam;* 10. kartofu dilim-dilim doğrayıb qızartmaq; 11. *d.d.* qabığını kəsmək *(çörəyin)*; **to ~ in** *d.d.* 1) iştirak etmək, payçı olmaq; 2) girişmək, qarışmaq *(söhbətə və s.)*; *He's always chipping in O həmişə söhbətə qarışır;* **to ~ out** kəsmək, kəsib çıxartmaq / ayırmaq
**chip** [tʃɪp] *v* II 1. *dial.* badalaq vurmaq / vermək; 2. büdrəmək, ayağı dolaşmaq
**chip-ax** [ˈtʃɪpæks] *n* qiyməkeş, baltacıq; dəhrə
**chipmunk** [ˈtʃɪpmʌŋk] *n zool.* burunduk *(qəşəng dərisi olan xırda gəmirici heyvan)*
**chipped** [tʃɪpt] *adj* 1. kələ-kötür, nahamar; 2. qıraqları sınmış *(qab haq.)*; 3. çınqılla/qırmadaşla örtülmüş; **~ surface** üstü çınqılla/qırmadaşla örtülmüş səth *(yol haq.)*
**chipping** [ˈtʃɪpɪŋ] *n* 1. qələm *(dəmir və ya daş yonmaq üçün alət)* ilə təmizləmə; 2. *pl* qəlpə, qırıntı, qırıq; 3. yonqar; 4. çınqıl, qırmadaş / kərpic
**chipping hammer** [ˈtʃɪpɪŋˌhæməʳ] *n* böyük çəkic; kəsici çəkic

**chipping-squirrel** ['tʃɪpɪŋ'skwɪrəl] *n* = **chipmunk**
**chippy[1]** ['tʃɪpɪ] *n* I *amer. jarq.* gəzəyən qadın, fahişə, qəhbə
**chippy** ['tʃɪpɪ] *n* II bişirilmiş kartof və qızardılmış balıq satan mağaza
**chippy[2]** ['tʃɪpɪ] *adj* 1. dişənmiş, diş-diş *(bıçaq haq.)*; 2. sındırılmış, qırılmış, sınıq, qırılıb tökülmüş *(qab-qacağın qırağı haq.)*; 3. kəsilmiş, yarılmış, doğranmış; parçalanmış; 4. sıyrılmış, yonulmuş, rəndələnmiş; 5. qıxmıq kimi quru; 6. başı ağır / tutqun *(sərxoşluqdan sonra)*
**chirk[1]** [tʃə:k] *adj amer. d.d.* qızğın; işlək; canlı; diribaş, çevik, zirək
**chirk[2]** [tʃə:k] *v* 1. *amer.* şadlandırmaq, əyləndirmək, ürəyini açmaq; 2. ürəkləndirmək, ürək vermək, cürətləndirmək, cəsarətləndirmək, qeyrətləndirmək; 3. canlanmaq; 4. cikkildəmək, civildəmək, cik-cik etmək *(quş)*
**chirl[1]** [tʃə:l] *n* cəh-cəh, zəngulə
**chirl[2]** [tʃə:l] *v* cəh-cəh etmək, zəngulə vurmaq; oxumaq *(quş haq.)*
**chirognomist** [kaɪə'rɔgnəmɪst] *n* 1. falçı, əl falçısı, ələ baxıb fal açan; 2. falçı qadın
**chirognomy** [kaɪə'rɔgnəmɪ] *n* əl falı, ələ baxıb fal açma; falçılıq
**chirograph** ['kaɪrəgəra:f] *n hüq.* pul cəriməsi qoyulduğunu bildirən sənəd
**chirographer** [.kaɪə'rɔgrəfəʳ] *n* 1. = **chirographist**; 2. məhkəmə pristavı/icraçısı *(cərimə yığan)*
**chirographist** [.kaɪə'rɔgrəfɪst] *n* 1. *tar.* vergi yazan *(qədim Rusiyada)*; 2. mirzə
**chiromancy** ['kaɪərəmænsɪ] *n* əlfalı, ələ baxaraq fal açma
**chiropodist** [kɪ'rɔpədɪst] *n* pedikür ustası; pedikürçü, pedikür edən qadın
**chiropody** [kɪ'rɔpədɪ] *n* pedikür *(ayaq dırnaqlarına qulluq etmə və ayaqdakı qabarları kəsmə)*
**chirp[1]** [tʃə:p] *n* cik-cik, cik-cik etmə, cikkildəmə, cikkilti, civilti; səs *(quş səsi)*; cırıldama *(cırcırama və s.)*
**chirp[2]** [tʃə:p] *v* 1. cikkildəmək, cik-cik etmək, civildəmək *(quş haq.)*; vızıldamaq, vıyıldamaq *(ağcaqanad və s.)*, cırıldamaq *(cırcırama haq.)*; 2. mızıldamaq *(adam haq.)*; 3. sevinə-sevinə /ruh yüksəkliyi ilə danışmaq; bir nəfəsə danışmaq *(adam haq.)*
**chirper** ['tʃə:pəʳ] *n* 1. qışqırıqçı / hay-haray salan quş; vızıldayan həşərat; 2. çoxdanışan / naqqal / çərənçi qadın
**chirpy** ['tʃə:pɪ] *adj* 1. həmişə şən, həmişə şad, gülərüzlü; 2. diribaş, çevik, zirək, qızğın
**chirr[1]** [tʃə:ʳ] *n* cırıldama; tırıldama, çatırtı, partıltı, gurultu, səs-küy, xışıltı, xışıldama
**chirr[2]** [tʃə:ʳ] *v* 1. tırıldamaq, cırıldamaq, çatırdamaq, şıqqıldamaq; 2. xışıldamaq *(qarğı, qamış haq.)*
**chirrup[1]** ['tʃɪrəp] *n* 1. civilti, cikkilti; cəh-cəh; cik-cik, cikkildəmə, civilti; cırıldama; 2. boş danışıq, boşboğazlıq, cəfəngiyyat; 3. muşqurma
**chirrup[2]** ['tʃɪrəp] *v* 1. civildəmək, cikkildəmək *(quş)*, cik-cik etmək, cırıldamaq *(cırcırama və s. haq.)*; 2. şən / şad halda / gülə-gülə danışmaq; 3. muşqurmaq *(at və s. sürərkən)*
**chirurgery** [kaɪ'rə:dʒərɪ] *n arx* cərrahlıq
**chisel[1]** ['tʃɪzl] *n* I 1. kəpək un; 2. ələnməmiş un
**chisel** ['tʃɪzl] *n* II iskənə; zubilo *(dəmir və daş yonmaq üçün alət)*; həkkak / heykəltəraş qələmi *(daş, dəmir, ağac və s. üzərində naxış açmaq üçün alət)*
**chisel[2]** ['tʃɪzl] *v* 1. heykəl qayırmaq / tökmək; 2. oymaq, qazımaq, həkk etmək, taraşlamaq; 3. kəsmək, kəsib çıxartmaq *(ağac)*; 4. zərb etmək; naxış basmaq *(metala)*; yiv açmaq; 5. iskənə/zubilo ilə işləmək; iskənə/zubilo ilə düzəltmək; deşmək, dəlmək *(iskənə/zubilo ilə)*; 6. *d.d.* aldatmaq, tovlamaq, kələk/hiylə/fırıldaq gəlmək, dələduzluq/hiyləgərlik/fırıldaqçılıq etmək
**chiseller** ['tʃɪzləʳ] *n* 1. kəsən, zərb edən, naxış vuran/basan *(usta)*; oymaçı; həkkak, oyucu *(daşın, sümüyün, ağacın üzərində naxış açan)*; 2. *d.d.* fırıldaqçı, hiyləgər, dələduz, adamaldadan, fırıldaqçı, tülüngü
**chiselling** ['tʃɪzlɪŋ] *n* 1. oyma, qazıma; həkk etmə; taraşlama; yonma; kəsib çıxartma; naxış açma; 2. zərb etmə, kəsmə, kəsilmə *(pul, medal)*, naxış *(metalda)*; 3. *tex.* iskənə ilə işləmə/düzəltmə/hazırlama; 4. *tib.* ~ **open** sıxıb / basıb çıxartma *(irini və s.)*
**chit[1]** [tʃɪt] *n* I 1. uşaq, bala, körpə bala; ~ **of a girl** cavan/yetişmiş/yetkin qız; qızcığaz; 2. *arx.* bala *(heyvanlarda)*; pişik / canavar / tülkü və s. balası
**chit[2]** [tʃɪt] *n* II 1. *d.d.* qısa məktub, kağız; 2. qəbz *(yemək və içki üçün pul yerinə verilən)*; hesab; 3. zəmanət, yaxşı rəy; xasiyyətnamə; 4. yazılı göstəriş, order *(müəyyən əməliyyat aparmaq üçün yazılı sənəd)*; 5. vəsiqə, buraxılış/icazə vərəqəsi, icazənamə *(bir yerə daxil olmaq üçün sənəd)*
**chit** [tʃɪt] *n* III zoğ, cücərti
**chit[2]** [tʃɪt] *v* zoğ buraxmaq, cücərmək, cücərti vermək
**chit-chat** ['tʃɪttʃæt] *n* 1. boşboğazlıq, boş danışıq, laqqırtı, ordan-burdan danışma, gap etmə; 2. qeybət, dedi-qodu
**chivalrous** ['ʃɪvlrəs] *adj* rıtsar, cəngavər; alicənab, mərd; nəcib; comərd
**chivalrously** ['ʃɪvlrəslɪ] *adv* alicənablıqla, comərdcəsinə, comərdliklə, mərdcəsinə, mərdliklə, alicənabcasına
**chivalry** ['ʃɪvəlrɪ] *n* 1. rıtsarlıq *(rıtsar adı)*; 2. *məc.* alicənablıq, comərdlik, mərdlik, nəciblik; 3. *top.i* rıtsarlar *(Qərbi Avropada feodalizm dövründə hərbi-zadəgan təbəqəsi)*; **the age of** ~ rıtsarlar əsri/dövrü; **tale of** ~ rıtsar romanı; 4.



rıtsarlıq ləyaqəti; 5. *tar.* rıtsar qəhrəmanlığı / igidliyi / rəşadəti / hünəri
**chivied** ['tʃɪvɪd] *adj* incidilmiş, əzab verilmiş, əldən/haldan düşmüş; yorğun, üzgün, tabsız; çox yorulmuş
**chloride** ['klɔ:raɪd] *n kim.* xlor; **sodium** ~ xörək duzu
**chlorinate** ['klɔ:rɪneɪt] *v kim.* xlorlamaq, xlorlaşdırmaq
**chlorinated** ['klɔ:rɪneɪtɪd] *adj* xlorlanmış, xlorlaşdırılmış
**chlorination** [.klɔ:rɪ'neɪʃn] *n kim.* xlorlama, xlorlanma, xlorlaşdırma
**chlorine** ['klɔ:rɪ:n] *n kim.* xlor
**chloroform** ['klɔrəfɔ:m] *n tib.* xloroform *(narkoz, yuxulatma dərmanı)*
**chlorous** ['klɔ:rəs] *adj kim.* xlorlu; ~ **acid** xlor turşusu, xlorlu turşu
**chocolate[1]** ['tʃɔkəlɪt] *n* 1. şokolad; **a bar of** ~ bir plitka şokolad; 2. *pl* şokolad konfeti; **a box of** ~**s** bir qutu şokolad konfeti; 3. qəhvəyi *(rəng)*
**chocolate[2]** ['tʃɔkəlɪt] *adj* 1. şokolad, şokoladlı; ~ **ice** şokoladlı dondurma; 2. şokolad rəngli
**chocolate-house** ['tʃɔkəlɪthaus] *n arx.* 1. qənnadı /şirniyyat mağazası; 2. qəhvəxana
**choice[1]** [tʃɔɪs] *n* 1. seçmə, seçilmə, seçib götürmə; **to make a** ~ **of** *smth.* bir şeyi seçmək; **to make** *one's* ~ seçmək; **to take** *one's* ~ öz istədiyini seçmək; *Take your choice of rooms İstədiyin/İstədiyiniz otağı seç/seçin; Make a careful choice, Be careful in your choice Seçimdə ehtiyatlı ol / olun*; 2. çeşid, assortiment; **wide / poor** ~ böyük / az çeşid; 3. alternativ, seçmə imkanı; *I have no choice in the matter Mənim bu məsələdə seçmə imkanım yoxdur; He had no choice in the determination of his profession Onun sənət seçmə imkanı olmayıb; He had no choice but to go Onun getməkdən başqa ayrı çıxış yolu / əlacı yox idi*; 4. seçilmiş, seçilən; *This is my choice Mən bunu seçirəm*; 5. seçilmiş nümayəndə; *He was the people's choice O, xalqın seçilmiş nümayəndəsi idi; I don't like him but if he is the people's choice for president I will obey him Mənim ondan xoşum gəlmir, lakin xalq onu prezident seçsə, mən ona itaət edəcəm*; 6. bir şeyin ən yaxşı hissəsi / qaymağı / gülü; 7. *arx.* seçmə qabiliyyəti / bacarığı
**choice[2]** [tʃɔɪs] *adj* 1. seçmə, seçilmiş; ən yaxşı, əla; ~ **goods** seçmə mal; ~ **apples** seçmə alma; *The shop is selling choice apples Bu mağaza seçmə alma satır*; ~ **passage / piece** seçilmiş hissə *(kitabdan)*; *He told the story in choice phrases O, əhvalatın əsas hissələrini danışdı*; 2. gözəl, zərif, incə, nəfis; ~ **and master spirit** incə və dərin zəka; 3. *dial.* ehtiyatlı, ciddi, tələbkar; 4. mehriban, gülərüzlü, üzügülər, nəvazişkar, xoşrəftar, iltifatlı; 5. qənaətcil, qənaətkar, ehtiyatlı
**choiceful** ['tʃɔɪsful] *adj* 1. ehtiyatlı, ciddi, tələbkar, çətin bəyənən; 2. seçməyə imkan verən
**choicely** ['tʃɔɪslɪ] *adv* diqqətlə, səliqə ilə, əsaslı surətdə
**choiceness** ['tʃɔɪsnɪs] *n* yüksək keyfiyyət; yüksək dəyanət / ləyaqət; **the** ~ **of the language** dilin incəliyi / gözəlliyi
**choir[1]** ['kwaɪəʳ] *n* 1. xor, kilsə xoru; **a church** ~ kilsə xoru; **a school** ~ məktəb xoru; 2. xor ansamblı, kapella *(xor dəstəsi)*; 3. oxuyanlar və oynayanlar truppası / kollektivi
**choir[2]** ['kwaɪəʳ] *v* xorla oxumaq
**choir-boy** ['kwaɪəbɔɪ] *n* xorda oxuyan oğlan
**choir-master** ['kwaɪə.ma:stəʳ] *n* xormeystr *(xor dəstəsinin rəhbəri)*
**choke[1]** [tʃouk] *n* 1. təngnəfəslik, nəfəs tutulması, təngişmə; 2. boğma, boğulma; 3. bağlanmış uc *(kisənin, torbanın və s.)*; 4. *tex.* drossel *(mayenin, qazın, buxarın təzyiqini və işlənməsini nizama salmaq üçün qurğu)*
**choke[2]** [tʃouk] *v* 1. boğmaq; **to** ~ **to death** boğmaq, boğub öldürmək; *The smoke almost choked me Tüstü məni az qala boğmuşdu*; **to** ~ **the life out of** *smb.* bir kəsi boğub öldürmək; *Tears choked her Göz yaşı onu boğdu*; 2. boğulmaq; **to** ~ **with smoke** tüstüdən boğulmaq; **to** ~ **with rage** hiddətdən/qəzəbdən boğulmaq; 3. qəhərlənmək, boğulmaq; boğazında şey qalmaq, çeçəmək; **to** ~ **on a bone** boğazında sümük qalmaq; *He swallowed a plum-stone and was almost choked O, gavalı çəyirdəyini uddu və az qaldı ki, boğulsun*; **to** ~ **with tears** göz yaşlarından boğulmaq; *Water went down his throat and he started to choke O, sudan çeçədi və boğulmağa başladı*; 4. söndürmək; **to** ~ **a fire** tonqalı / ocağı söndürmək; 5. basmaq; **to** ~ **a plant** bitkini basmaq *(alaq otları haq.)*; *The garden is choked (up) with weeds Alaq otları bağı basıb*; 6. zibilləmək, yolunu tutmaq; *The chimney is choked (up) with soot Boru / Baca hislə dolub, His bacanın yolunu tutub*; 7. bağlamaq; tıxaclamaq, tıxac əmələ gətirmək; **to** ~ **the highway** şose yolunu bağlamaq, şose yolunda tıxac əmələ gətirmək; 8. daşana qədər doldurmaq *(kisə və s. haq.)*, ağzına qədər doldurmaq; **to** ~ **back** boğmaq, üzə çıxmağa qoymamaq *(hissi, ağlamağı, hıçqırığı və s.)*; **to** ~ **down** 1) güclə udmaq; 2) saxlamaq, yatırmaq, susdurmaq, qarşısını almaq *(həyəcanı, çaxnaşmanı və s.)*; **to** ~ **down tears** ağlamağını saxlamaq, ağlamağının qarşısını almaq; *He choked down his anger O, hirsini /qəzəbini cilovladı / boğdu*; **to** ~ **off** 1) ölənə qədər/kimi boğmaq; 2) söndürmək, boğmaq, inkişafına imkan verməmək *(təşəbbüs, cəhd və s. haq.)*; 3) *d.d.* tovlamaq, fikrindən daşındırmaq, fikirləşməyə məcbur etmək; 4) aradan götürmək, yox etmək; kənar etmək *(bir kəsi)*; **to** ~ **up** 1) zibilləmək, zibillənmək, tutul-

maq *(zibildən); The pipe is choked Boru tutulub (zibildən);* 2) basmaq *(alaq otları ilə);* 3) doldurmaq *(çayı qumla);* 4) doldurmaq; *The room was choked up with old furniture Otaq köhnə mebellə dolu idi;* 5) öskürüb / hayxırıb tüpürmək; 6) *amer. d.d.* başını / özünü itirmək, quruyub / donub qalmaq

**choke-damp** ['tʃoukdæmp] *n* boğucu qaz

**choker** ['tʃoukə[r]] *n* 1. boğucu, boğan; 2. hündür kraxmallı yaxalıq; 3. yuxarıdan bağlanmış qalstuk/şərf; 4. dar boyunbağı

**choking**[1] ['tʃoukıŋ] *n* 1. təngnəfəslik, nəfəs tutulması, təngişmə, boğulma; 2. bağlanma, tutulma, tıxanma, dolma; qalama, doldurma *(iri şeylərlə)*

**choking**[2] ['tʃoukıŋ] *adj* 1. boğulan, təngnəfəs olan; tövşüyən; 2. boğucu; ~ **gas** *hərb.* boğucu qaz

**chokingly** ['tʃoukıŋlı] *adv* boğula-boğula *(həyəcandan, tələşdən)*, təngnəfəs surətdə / halda

**choky** ['tʃoukı] *adj* 1. boğulan, təngnəfəs olan, tövşüyən; *I feel choky Boğuluram, Nəfəs ala bilmirəm, Nəfəsim daralır / tutulur;* 2. bürkü, bürkülü, boğanaq; boğucu; 3. bərk, yeyilməyən, yeyilməsi mümkün olmayan, dişbatmaz

**cholecyst** ['kəlısıst] *n anat.* öd kisəsi

**cholecystitis** [.kəlısıs'taıtıs] *n tib.* xolesistit *(öd kisəsinin iltihabı)*

**choler** ['kələ[r]] *n d.d.* 1. öd; 2. qəzəb, qeyz, hirs

**cholera** ['kələrə] *n tib.* vəba, ovma *(xəstəlik);* **Asiatic** ~ Asiya vəbası

**choleric** ['kələrık] *adj* 1. vəba, vəbalı; vəbalı xəstələrə məxsus; 2. qıcıqlandırıcı; 3. qəzəblənmiş, qeyzlənmiş, acıqlanmış, hirslənmiş

**choose** [tʃu:z] *v (pt* **chose**; *pp* **chosen**) 1. seçmək; **to ~ an apple/a friend/a book, *etc.*** alma / dost / kitab və s. seçmək; **to ~ books for the library** kitabxana üçün kitab seçmək; **to ~ a leader / a chairman** rəhbər / sədr seçmək; 2. üstün tutmaq; daha yaxşı bilmək; qərara almaq; vacib / gərəkli / lazım bilmək; *Choose for yourself Özün / Özünüz seç / seçin; He chose to stay where he was O, köhnə yerində qalmaq qərarına gəldi; He chose to hide O gizlənməyi üstün tutdu; He chose not to see the girl O qərara aldı ki, qızla görüşməsin; I don't choose to agree Mən razılaşmaq fikrində deyiləm;*

◊ *I cannot ~ but ... Mən məcburam..., I cannot choose but to agree Mənim razılaşmaqdan başqa əlacım yoxdur*

**choosey** ['tʃu:zı] *adj* = **choosy**

**choosy** ['tʃu:zı] *adj* vasvası, şıltaq, inadcıl; tələbkar, çətin bəyənən; **to be** ~ vasvası olmaq; *Don't be so choosy Belə vasvası olma/olmayın; Jane is very choosy about what she eats Ceyn yeməkdə çox vasvasıdır*

**chop**[1] [tʃɔp] *n* I 1. zərbə *(balta, çapacaq və s. ilə endirilən);* 2. əzmə kotlet; **mutton / pork** ~ qoyun / donuz ətindən əzmə kotlet; 3. dilim, fal, parça, tikə; 4. xırda / xəfif / kiçik ləpə *(dənizdə);* 5. *amer.* çat, çatlaq, çatlamış yer, yarıq *(xüs. dəridə);* 6. *k.t.* navala *(heyvan yemi)*

**chop** [tʃɔp] *n* II 1. zərbə *(balta və s. ilə); The mad murderer cut off her head with just one chop of the axe Dəli cani onun başını balta ilə bir zərbədə kəsdi;* 2. sümüklü ət parçası; *We're having lamb chops for dinner Biz naharda quzu ətindən soyutma yeyəcəyik;* 3. dalğaların zərbəsi; *We could feel the chop of the waves moving the boat up and down Biz qayığı atıb-tutan dalğaların zərbələrini hiss edə bilirdik;* 4. *sl* işdən çıxarılma/ kənar edilmə; *He got the chop for being late Gecikdiyinə görə onu işdən çıxartdılar*

**chop** [tʃɔp] *n* III dəyişmə, dəyişdirmə, dəyişdirilmə *(küləyin istiqaməti, fikir, rəy və s. haq.);* **~s and changes** mütəmadi dəyişmə; tərəddüd, qərarsızlıq

**chop** [tʃɔp] *n* IV 1. damğa; möhür; fabrik markası; 2. növ, çeşid, sort; **first/second** ~ birinci/ikinci növ; 3. lisenziya *(xaricə mal aparmaq və ya xaricdən mal gətirmək üçün icazə, həmin icazəni təsdiq edən sənəd)*

**chop** [tʃɔp] *n* V 1. *adət. pl* çənələr; yanaqlar; 2. *pl* ağız, heyvan ağzı, cəhəng *(heyvanlarda);* 3. *pl* giriş *(dərəyə, boğaza və s.)* **~s of the channel** Atlantik okeanından La-Manş boğazına giriş;

◊ **to lick *one's* ~s** dodaqlarını yalamaq *(yemək vaxtı),* ləzzətlə yemək/içmək, zövq/ləzzət almaq *(xüs. yemək-içməkdən)*

**chop**[2] [tʃɔp] *v (-pp-)* I 1. doğramaq, kəsmək, yarmaq *(balta və s. ilə); He chopped the block of wood in two with a single blow O, kötüyü bircə zərbə ilə ikiyə böldü; I've been chopping (away) at this tree for half an hour with no results Mən yarım saatdır ki, bu ağacı kəsirəm, amma nəticə yoxdur;* 2. xırda-xırda doğramaq; *Chop the onions up, please Zəhmət olmasa, bu soğanları xırda-xırda doğra/doğrayın;* 3. **(at)** əl qaldırmaq; zərbə endirmək; *He chopped at me with his knife, but missed O, bıçağı ilə mənə zərbə endirdi, lakin əli boşa çıxdı;* **to ~ away** kəsib / qoparıb atmaq; **to ~ down a tree** ağacı kəsib yıxmaq; **to ~ off** 1) kəsib atmaq *(budaqları);* 2) vurmaq, kəsmək *(budağı və s.)*

**chop** [tʃɔp] *v (-pp-)* II 1. kəskin surətdə dəyişmək; 2. mübadilə etmək, dəyişdirilmək; 3. mübahisə etmək, sözləşmək; **to ~ logic** uzunçuluq etmək, mübahisə etmək, çürükçülük etmək; **to ~ about / round** qəflətən istiqamətini dəyişmək *(külək haq.);*

◊ **to ~ and change** aramsız / mütəmadi olaraq dəyişmək, tez-tez dəyişmək; *The wind keeps chopping about, so it might be dangerous to go sailing Külək aramsız olaraq istiqamətini dəyişir, buna görə açıq dənizə çıxmaq təhlükəli ola bilər; I wish you wouldn't chop and change your mind like this Mən istərdim ki, sən / siz öz fikrini / fikrinizi tez-tez dəyişməyəsən/dəyişməyəsiniz*



**chop-chop**[1] ['tʃɔp'tʃɔp] *adv amer. d.d.* tez-tez, cəld-cəld

**chop-chop**[2] ['tʃɔp'tʃɔp] *inter Qaç! Yüyür! Tez ol / olun! Hərəkətə gəl / gəlin!*

**chop-house** ['tʃɔphaus] *n* I *tar.* gömrükxana *(Çində)*

**chop-house** ['tʃɔphaus] *n* II 1. ət xörəyi verən restoran; 2. aşxana, yeməkxana, kababçı dükanı, kababxana

**chop-in** ['tʃɔpın] *n* kəsmə; topa kəsmə zərbə vurma *(tennis oyununda)*

**chopped** [tʃɔpt] *adj* döyülmüş; ~ **meat** döyülmüş ət; ~ **green** *k.t.* doğranmış yaşıl yem; ~ **straw** saman

**chopper** ['tʃɔpə[r]] *n* 1. bıçaq *(qəssab bıçağı);* 2. dəhrə; 3. balta *(odun yarmaq üçün);* 4. çapacaq, qiyməkeş; 5.*k.t.* yemdoğrayan, yemxırdalayan; 6. *amer.* meşəqıran, ağackəsən *(fəhlə);* 7. *amer.* biletə baxan, bilet yoxlayan işçi

**chopper-switch** ['tʃɔpəswıtʃ] *n el.* rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*

**chopping**[1] ['tʃɔpıŋ] *n* 1. kəsmə, yarma, doğrama *(odun, küləş və s.);* 2. əti maşından keçirmə; 3. *k.t.* seyrəltmə

**chopping**[2] [tʃɔpıŋ] *adj* ucaboy, boylu-buxunlu; gövdəli, yekəpər; möhkəm, sağlam, bərk, güclü

**choppy** ['tʃɔpı] *adj* 1. istiqamətini tez-tez dəyişən; coşğun, kəskin *(külək haq.);* 2. dəyişkən, qərarsız, səbatsız, külək kimi dəyişkən, ~ **market** qeyri-sabit bazar; 3. narahat, həyəcanlı, təlatümlü *(dəniz haq.);* 4. kəskin, coşğun *(hərəkət haq.);* qırıq, qırıq-qırıq, kəsik-kəsik, rabitəsiz; çatlaq-çatlaq, yarıq-yarıq, çatlağı/ yarığı çox olan

**choral**[1] ['kəra:l] *n mus.* xoral *(1) katoliklərdə və protestantlarda xor şəklində oxunulan dua; 2) bu səpkidə yazılmış musiqi əsəri)*

**choral**[2] ['kɔ:rəl] *adj* xor; ~ **society** oxuyanlar ansamblı, xor; **a ~ group** xorla ibadət

**chord**[1] [kɔ:d] *n* I *mus.* akkord *(bir-birindən aralı olan bir neçə tonun ahəngdar bir surətdə səslənməsi)*

**chord** [kɔ:d] *n* II 1. *şair.* sim, tel; **to strike / to touch the right** ~ yaralı yerinə toxunmaq; **to strike a deep ~ in the hearts** ürəklərdə dərin əks-səda doğurmaq; 2. *anat.* tel, bağ; **vocal ~s** səs telləri; 3. *riyaz.* xorda *(əyri xəttin iki nöqtəsini birləşdirən düz xətt)*

**chord**[2] [kɔ:d] *v* I 1. həmahəng /uyğun olmaq, uyğun gəlmək; 2. birləşdirmək; uyğunlaşdırmaq

**chorded** ['kɔ:dıd] *adj* həmahəng, ahəngdar, uyğun, müvafiq

**chore** [tʃɔ:] *n amer.* 1. gündəlik / günəmuzd iş; 2. *(əsasən pl)* ev işləri; **daily ~s** gündəlik ev işləri; *Each morning she would get up, do the chores, then go next door for a talk with her neighbour O hər gün yerindən qalxar, ev işlərini görər, sonra isə qapıbir qonşusu ilə söhbət etməyə gedərdi; Her chore is washing the dishes Onun gündəlik işi qab-qacağı yumaqdır;* 3. zəhlətökən/xoşagəlməz iş; *It is such a chore to do the shopping every day Hər gün bazarlıq etmək zəhlətökən işdir*

**chorea** [kɔ'rıə] *n tib.* xoreya *(əl-ayağın qeyri-ixtiyari titrəməsindən ibarət əsəb xəstəliyi)*

**choreograph** ['kɔrıəgra:f] *n* = **choreographer**

**choreographer** [.kɔrı'ɔgræfə[r]] *n* baletmeyster *(balet rəhbəri, rəqs müəllimi)*

**choreographic** [.kɔrıə'græfık] *adj* rəqs, balet

**choreography** [.kɔrı'ɔgrəfı] *n* xoreoqrafiya, rəqs sənəti

**chorist** ['kɔrıst] *n* 1. xorist, xorda iştirak edən *(qədim yunan teatrında);* 2. xorda oxuyan, xor ansamblında iştirak edən

**chorus**[1] ['kɔ:rəs] *n* 1. xor, xor qrupu; **in ~** xorla; **a ~ of protest** ümumi kəskin etiraz; *The minister's speech was met with a chorus of shouts Nazirin çıxışı kəskin etirazla qarşılandı;* 2. *teatr.* xor və balet *(dram teatrında);* kordebalet *(dəstə ilə oynayan balet artistləri heyəti);* müğənnilər dəstəsi; mahnı və rəqs ansamblı; xor *(qədim yunan teatrında);* 3. *məc.* kommentator, şərhçi, izahçı; 4. *mus.* nəqərat; 5. xor üçün yazılmış musiqi əsəri

**chorus**[2] ['kɔ:rəs] *v* 1. xorla oxumaq; xorla demək /danışmaq / oxumaq və s.; 2. təkrarlamaq, təkrar etmək, bəli-bəli demək

**chosen** [tʃouzn] **to choose** *felinin pp forması*

**chouse**[1] [tʃaus] *n d.d.* fırıldaq, hiyləgərlik, dələduzluq, adamaldatma; yalan, aldatma, hiylə, kələk

**chouse**[2] [tʃaus] *v d.d.* aldatmaq, tovlamaq, kələk / hiylə gəlmək

**chouser** ['tʃausə[r]] *n* yalançı, fırıldaqçı, hiyləgər, dələduz, adamaldadan

**Christ** [kraıst] *n* İsa; **Jesus Christ** İusus Xristos

**christen** ['krısn] *v* 1. xristian etmək, xaç suyuna salmaq; 2. xaç vurmaq / çevirmək / çəkmək; 3. xaç atası və ya xaç anası olmaq; 4. xaç suyuna salarkən ad vermək; *The child was christened Mary after her grandmother Qız uşağına nənəsinin şərəfinə Meri adı verdilər/ qoydular;* 5. ləqəb /ayama qoymaq *(adamlara);* 6. *d.d.* təzələmək, yeniləşdirmək, ilk dəfə istifadə etmək *(bir şeydən)*

**Christendom** ['krısndəm] *n* 1. xristian dünyası /ölkələri; 2. *top.i* xristianlar, xaçpərəstlər

**christening** ['krısnıŋ] *n* xaç suyuna salma *(xristianlığın qəbul olunma mərasimi)*

**Christhood** ['kraısthud] *n din.* messianizm *(bəzi dinlərə görə allah tərəfindən yer üzünə xilaskar gələcəyi haqqında etiqad)*

**Christian**[1] ['krıstjən] *n* xristian, xaçpərəst

**Christian**[2] ['krıstjən] *adj* xristian; xristianlıq; ~

**name** xristian adı; **Court** ~ *tar.* kilsə məhkəməsi; ~ **era** xristianlıq dövrü / erası; **in I century of** ~ **era** bizim eranın I əsrində

**Christianity** [ˌkrɪstɪˈænɪtɪ] *n* **1.** xristianlıq, xristian dini, xaçpərəstlik; **2.** *top.i* xristianlar, xristianlıq aləmi

**Christianize** [ˈkrɪstjənaɪz] *v* xristian etmək, xristianlaşdırmaq, xristian dinini qəbul etdirmək /etmək

**Christianlike** [ˈkrɪstjənlaɪk] *adv* xristian kimi, xristiana layiq

**Christless** [ˈkraɪstlɪs] *adj din.* Xrista / İsaya inanmayan, xaçpərəst dinini qəbul etməyən, xristian dininə inanmayan

**Christmas[1]** [ˈkrɪsməs] *n kils.* milad günü *(xristianlarda əfsanəvi peyğəmbər İsanın anadan olması gününün bayramı);* **Father** ~ Şaxta baba; *Merry Christmas! Milad bayramınız mübarək, Milad bayramınızı təbrik edirəm!*

**Christmas[2]** [ˈkrɪsməs] *adj:* ~ **card** Milad bayramını təbrik etmək üçün kartoçka; ~ **gifts** Milad bayramı hədiyyələri

**christmas[3]** [ˈkrɪsməs] *v* **1.** *d.d.* Milad bayramı üçün bəzəmək; **2.** Milad bayramını qeyd etmək

**Christmas-box** [ˈkrɪsməsbɔks] *n* Milad bayramı üçün hədiyyələr qoyulmuş qutu, Milad bayramı hədiyyələri

**Christmas-day** [ˈkrɪsmədeɪ] *n* Milad bayramının birinci günü *(25 dekabr)*

**Christmas-eve** [ˈkrɪsməsiːv] *n* Milad axşamı; xaçaçuran axşamı; Milad bayramı ərəfəsi *(24 dekabr)*

**Christmassy** [ˈkrɪsməsɪ] *adj d.d.* Milad bayramı ovqatında, şən, şad, sevincək

**Christmas-tide** [ˈkrɪsməstaɪd] *n* Milad bayramı günləri *(24 dekabrdan 6 yanvara qədər olan müddət)*

**Christmas-tree** [ˈkrɪsməstriː] *n* Milad bayramı yolkası

**christ's thorn** [ˈkraɪstsˈθɔːn] *n bot.* yemişan

**chromate** [ˈkroumɪt] *n kim.* xromat; xrom turşusunun duzu

**chromatic** [krəˈmætɪk] *adj* xromatik; rəngli; ~ **press** *poliqr.* rəngli çap üçün maşın; ~ **printing** *poliqr.* rəngli çap

**chromic** [ˈkroumɪk] *adj kim.* xromlu, xrom qarışığı olan; ~ **dyeing** xromlu rəngləmə

**chromite** [ˈkroumaɪt] *n* xromit *(1) tərkibində xrom və dəmir olan filiz; 2) metallurgiyada işlənən odadavamlı material)*

**chromize** [ˈkroumaɪz] *v tex.* xromlamaq, xromla örtmək, üzünə xrom çəkmək *(metal şeylərin)*

**chromosome** [ˈkrouməsoum] *n biol.* xromosom *(heyvan və bitki orqanizmlərinin hüceyrə nüvələrində olan və müvafiq surətdə boyadıldıqda, hüceyrələr ayrıldığı zaman gözə görünən cisimciklər)*

**chromosphere** [ˈkrouməsfɪəʳ] *n* xromosfer *(Günəş tutulan zaman, onun ətrafında qırmızı haşiyə kimi görünən Günəş atmosferinin xarici təbəqəsi)*

**chronic** [ˈkrɔnɪk] *adj* **1.** xroniki, uzunsürən, çox davam edən *(xəstəlik haq.);* **2.** xronik xəstəliyi olan, xroniki xəstəliyə tutulan; ~ **invalid** xroniki xəstə; ~ **rheumatizm** xroniki revmatizm/yel; **3.** daimi, həmişəlik; arasıkəsilməz, arası kəsilməyən; ~ **headache** daimi başağrısı; ~ **doubts** daimi şübhələr; ~ **wars** arasıkəsilməyən/daimi müharibələr; ~ **poverty** daimi ehtiyac

**chronical** [ˈkrɔnɪkəl] *adj* = **chronic**

**chronically** [ˈkrɔnɪkəlɪ] *adv* **1.** xroniki olaraq / bir tərzdə; uzun müddət / zaman; **2.** həmişə, daim, həmişəlik

**chronicity** [krəˈnɪsɪtɪ] *n* xronikilik, xroniki xüsusiyyət *(xəstəlik haq.)*

**chronicle[1]** [ˈkrɔnɪkl] *n* **1.** salnamə *(hadisələrin tarixi ardıcıllıqla yazılışı);* **2.** xronika *(siyasi, ictimai, ailə və s. hadisələrin tarixini təsvir edən ədəbi əsər);* **3.** xronika *(qəzetdə yerli xəbərlər şöbəsi)*

**chronicle[2]** [ˈkrɔnɪkl] *v* yazmaq, qeyd etmək *(gündəliyə, salnaməyə);*

◊ **to** ~ **small beer** hər xırda şeyi qeydə almaq, boş / mənasız işlə məşğul olmaq

**chronograph** [ˈkrɔnəgraːf] *n* xronoqraf *(1) bir ölkənin tarixi xronikasının xülasəsindən ibarət qədim yazılı abidə; 2) qısa sürən hərəkətləri / sürəti ölçmək üçün avtomatik cihaz);* **registering** ~ özüyazan xronoqraf

**chronographer** [krəˈnɔgrəfəʳ] *n* salnaməçi, salnamə yazan; xronologiya tərtib edən adam; tarixçi, tarix yazan

**chronographic** [ˌkrɔnəˈgræfɪk] *adj* xronoqraf, xronoqrafik

**chronography** [ˌkrɔnəˈgræfɪ] *n* hadisələri xronoloji olaraq şərh/ izah etmə; salnamə tərtib etmə

**chronologer** [krəˈnɔlədʒəʳ] *n* tarixçi, xronologiya tərtib edən mütəxəssis

**chronologic** [ˌkrɔnəˈlɔdʒɪk] *adj* xronoloji, xronologiya

**chronological** [ˌkrɔnəˈlɔdʒɪkəl] *adj* = **chronologic**

**chronologist** [krəˈnɔlədʒɪst] *n* = **chronologer**

**chronologize** [krəˈnɔlədʒaɪz] *v* xronoloji qaydada yerləşdirmək

**chronology** [krəˈnɔlədʒɪ] *n* **1.** xronologiya *(tarixi hadisələrin vaxt ardıcıllığı ilə yazılışı);* **2.** xronoloji cədvəl / göstərici

**chronometer** [krəˈnɔmɪtəʳ] *n* xronometr *(çox dəqiq saat və başqa cihazlar)*

**chronometric** [ˌkrɔnəˈmetrɪk] *adj* xronometr, xronometrik

**chronometrical** [ˌkrɔnəˈmetrɪkəl] *adj* = **chronometric**

**chronometry** [krəˈnɔmɪtrɪ] *n* xronometriya

**chronoscope** [ˈkrɔnəskoup] *n* xronoskop *(son dərəcə qısa vaxtları ölçmək üçün elektrik saatı)*



**chronoscopic** [ˌkrɔnəˈskɔpɪk] *adj* xronoskop, xronoskopik

**chub[1]** [tʃʌb] *n* **1.** *zool.* qolavl balığı; **2.** cöngə; **3.** xulbalığı

**chub[2]** [tʃʌb] *adj* = **chubby**

**chubbiness** [ˈtʃʌbɪnɪs] *n* girdəsifətlik, yumrusifətlik, köklük, koppuşluq

**chubby** [ˈtʃʌbɪ] *adj* girdəsifət, yumrusifət, fətirsifət, koppuşsifət; kök; ~ **cheeks** koppuş/yumru/yupyumru yanaqlar; ~ **baby** kök / koppuş uşaq

**chub-faced** [ˈtʃʌbfeɪst] *adj* girdəsifət, yumrusifət

**chuck[1]** [tʃʌk] *n* I **1.** cücə; **2.** qaqqıldama *(toyuq və s.)*

**chuck** [tʃʌk] *n* II **1.** tullama, tullanma; atma; sıçrayış, sıçrama; **2.** oryol-reşka oyunu

**chuck** [tʃʌk] *n* III *jarq.* yemək, yeyəcək, yeyinti, qida, xörək; **hard** ~ suxarı

**chuck** [tʃʌk] *n* IV girdin, odun, odun parçası, kötük

**chuck[2]** [tʃʌk] *v* I **1.** qaqqıldamaq *(toyuq və s.);* **2.** səsləmək, çağırmaq *(ev quşlarını);* **3.** tələsdirmək, qısnamaq *(atı)*

**chuck** [tʃʌk] *v* II **1.** atmaq, tullamaq; tolazlamaq; **2.** imtina etmək, əl çəkmək; **to** ~ **work** işi atmaq, işdən imtina etmək; **to** ~ **a friend** dostdan əl çəkmək, dostluğu kəsmək; **3.** tumarlamaq, oxşamaq; **4.** oryol-reşka oynamaq; **to** ~ **away 1)** boş yerə xərcləmək, küləyə sovurmaq; **2)** əldən vermək *(imkanı, şansı);* **to** ~ **out** qovmaq, çıxartmaq; vurub çıxartmaq *(otaqdan və s.);* **to** ~ **up** atmaq, əl çəkmək (işdən);

◊ *Chuck it! Bəsdir! Qurtar!/Qurtarın! Səsini kəs! / Səsinizi kəsin! Danışma!/ Danışmayın!* **to** ~ *one's* **hand in** təslim olmaq, özünü məğlub hesab etmək; **to** ~ *one's* **weight about** özünü iddialı / təkəbbürlü / lovğa aparmaq, iddia satmaq, lovğalanmaq, təşəxxüs satmaq

**chuck-farthing** [ˈtʃʌkˌfaːðɪŋ] *n* oryol-reşka oynama

**chuckle[1]** [ˈtʃʌkl] *n* **1.** boğuq gülüş; fınxırma, fınxırtı; hırıldama, hırıltı, bığaltı gülmə *(həzz alaraq);* **2.** qaqqıltı, qaqqıldama *(toyuq səsi);* qağıltı, qağıldama *(qaz səsi),* vağıltı, vağıldama *(ördək səsi)*

**chuckle[2]** [ˈtʃʌkl] *v* **1.** rişxənd etmək, altdan-altdan gülmək; bığaltı gülmək, irişmək; gülməkdən uğunmaq; *He was chuckling to himself over the letter Məktubu oxuyarkən o, öz-özünə bığaltı gülürdü;* **2.** qaqqıldamaq; qağıldamaq *(qaz haq.);* **3.** *arx.* qəhqəhə çəkmək, qəhqəhə ilə gülmək

**chuckle-head** [ˈtʃʌklhed] *n d.d.* gic, axmaq, qanmaz, korazehin

**chuckle-headed** [ˈtʃʌklˈhedɪd] *adj d.d.* axmaq, səfeh, gic, sarsaq, ağılsız, qanmaz, başıboş, yelbeyin

**chug[1]** [tʃʌg] *n* **1.** tövşümə, ləhləmə; hıqqanma, gücənmə, əlləşmə; **2.** fısıldama *(maşın, paravoz və s. haq.)*

**chug[2]** [tʃʌg] *v* (-gg-) **1.** tövşümək, ləhləmək; hıqqanmaq, əlləşmək; **2.** fısıldamaq *(maşın haq.); I heard the engine chugging along Mən maşının fısıldayaraq yol boyu getdiyini eşitdim*

**chum[1]** [tʃʌm] *n* **1.** *d.d.* yoldaş, dost, səmimi dost; **2.** bir yerdə/bir otaqda yaşayan, otaq yoldaşı *(yataqxanada, həbsxanada və s.),* məktəb yoldaşı

**chum[2]** [tʃʌm] *v* (-mm-) **1. (with, together)** birlikdə /birgə yaşamaq *(bir otaqda, bir yataqxanada və s.); He is going to chum with a friend next year O, gələn il dostlarından biri ilə bir yerdə yaşamaq fikrindədir;* **2. (with)** dostluq etmək; **3.** bir yerə köçürmək *(yaşamaq üçün);* **to** ~ **up (with)** dostlaşmaq, yaxınlaşmaq *(bir kəslə); I've only been here a few days but I've already chummed up with quite a lot of people Mən cəmi bir neçə gündür buradayam, amma artıq bir çox adamla dostlaşmışam*

**chummage** [ˈtʃʌmɪdʒ] *n* bir neçə adamı bir yerə köçürmə *(otağa, kameraya və s.)*

**chummery** [ˈtʃʌmərɪ] *n* **1.** tələbələrin və s. birgə yaşayışı *(bir otaqda);* **2.** bir neçə dostun / yoldaşın birgə kirayə etdiyi otaq; yataqxana

**chummy[1]** [ˈtʃʌmɪ] *n* I *d.d.* dost, aşna

**chummy** [ˈtʃʌmɪ] *n* II *jarq.* bacatəmizləyən oğlan

**chummy[2]** [ˈtʃʌmɪ] *adj* adamayovuşan, ünsiyyətli, mehriban, səmimi, dost

**chump[1]** [tʃʌmp] *n* **1.** kötük; **2.** *məc.* gic, səfeh, qanmaz, kütbeyin; **3.** *bir ucunun sonunda sümük olan can əti parçası*

**chump[2]** [tʃʌmp] *v amer.* **1.** çeynəmək, gəmirmək; **2.** çırtlamaq *(tum)*

**chumpish** [ˈtʃʌmpɪʃ] *adj amer. d.d.* **1.** küt, korazehin, kütbeyin, malbaş; **2.** tutqun, qaşqabaqlı, üzügülməz; **3.** hirsli, acıqlı, qeyzli

**chunk[1]** [tʃʌŋk] *n d.d.* **1.** dilim, fal; hissə, tikə; böyük parça; **2.** iri qaya, buz parçası; **3.** *amer.* şişman kişi/adam, kök kişi, kök qadın / arvad; yumru, koppuş; totuq *(uşaq, qız haq.);* **4.** *amer.* pota at;

◊ **to bite off a big** ~ çətin işdən / gücü çatmayan işdən yapışmaq

**chunk[2]** [tʃʌŋk] *v amer.* atmaq, tullamaq, tolazlamaq *(daş və s.);* **to** ~ **up 1)** yanacaq tullamaq *(ocağa);* **2)** yanacaq yığmaq

**chunking[1]** [ˈtʃʌŋkɪŋ] *n* **1.** cingilti, cınqıltı *(metal səsi);* **2.** şırıltı, qurultu *(qarında);* gurultu, şaqqıltı, xarıltı, gumbultu

**chunking[2]** [ˈtʃʌŋkɪŋ] *adj* böyük, yekə, iri, ağır, ləng; **a** ~ **piece of beef** bir yekə parça mal əti

**chunky** [ˈtʃʌŋkɪ] *adj* **1.** gödək və yoğun *(girdin, odun haq.);* **2.** gödək kök *(adam haq.);* **a** ~ **little man** gödək kök kişi

**church[1]** [tʃəːtʃ] *n* **1.** kilsə; **to go to** ~ kilsəyə getmək; *I'm going to church to see the priest Mən kilsəyə keşişi görməyə gedirəm; Do you agree with the separation of church and state? Sən / Siz kilsənin dövlətdən ayrılmasına razısan-mı?/razısınızmı?;* **Church of English** ingilis

kilsəsi; **Holy Church** müqəddəs kilsə *(katolik kilsəsi)*; **the established** ~ dövlət kilsəsi; **Free Church** müstəqil kilsə *(Şotlandiyada)*; *To what church does he belong? O, hansı dinə /məzhəbə inanır?*; **2.** ibadət; *Church is over İbadət qurtardı/sona çatdı*; **after** ~ obednyadan sonra *(xristianlıqda səhər və ya günorta ibadətindən sonra)*; **3.** *top.i* ruhanilər; **to go into the** ~ yüksək dini rütbə qəbul etmək;

◊ *Let the church stand in the churchyard at. söz.* ≅ *Hər şeyin öz yeri var, Qoy hər şey öz yerində qalsın*

**church²** [tʃə:tʃ] *adj* kilsə; ~ **attire** kilsə libası; ~ **book** kilsə/dua kitabı; ~ **burial** kilsədə dəfn mərasimi; ~ **door** kilsəyə giriş, kilsə artırması; **to abandon at the** ~ **door** toy qabağı nişanı pozmaq, gəlini və ya bəyi rədd etmək; ~ **folk** *d.d.* dövlət kilsəsinin tərəfdarları *(İngiltərədə)*; ~ **law** *hüq.* kilsə hüququ; ~ **member** mömin, dindar, inanan;

◊ **poor as a** ~ **mouse** kilsə siçanı kimi kasıb, bir quruşu olmama, çox kasıb olma

**church³** [tʃə:tʃ] *v* **1.** kilsəyə gətirmək/aparmaq *(xaç suyuna çəkmək üçün və s.)*; **2.** dini ayinləri/mərasimləri yerinə yetirmək; təmizləyici/pak edən dua oxumaq *(zahı qadın üçün)*; **to be ~ed** duanı qəbul etmək *(doğuşdan sonra)*

**churchdom** [ˈtʃə:tʃdəm] *n* **1.** kilsə idarəsi; kilsə hakimiyyəti; **2.** dini mənsəb / rütbə

**church-goer** [ˈtʃə:tʃ.gouəʳ] *n* dindar/mömin adam; cidd-cəhdlə kilsəyə gedən adam

**church-going** [ˈtʃə:tʃ.gouɪŋ] *n* müntəzəm / daim olaraq kilsəyə getmə; möminlik, dindarlıq

**church-house** [ˈtʃə:tʃhaus] *n* **1.** kilsə binası; **2.** ibadət evi

**churchizm** [ˈtʃə:tʃɪzm] *n* dindarlıq, möminlik; din / kilsə qaydaları

**churchless** [ˈtʃə:tʃlɪs] *adj* **1.** heç bir dini etiqada inanmayan; **2.** kilsəsiz *(kəbin və s. haq.)*; **3.** kilsəsi olmayan, kilsəsiz *(kənd və s.)*

**churchlet** [ˈtʃə:tʃlɪt] *n* kilsəcik, balaca kilsə / məbəd

**churchlike** [ˈtʃə:tʃlaɪk] *adj* kilsə kimi, kilsə ruhunda, kilsəyəbənzər; ~ **organization** kilsə tipli təşkilat

**churchly** [ˈtʃə:tʃlɪ] *adj* kilsə, kilsəyə məxsus / aid; dini; kilsəyə / dinə uyğun

**churchman** [ˈtʃə:tʃmən] *n (pl* **-men** [-mən]) **1.** din/kilsə xadimi; **2.** dindar, mövhumatçı, dinə inanan

**church-office** [ˈtʃə:tʃ.ɔfɪs] *n kils.* kilsə ayini / mərasimi

**church-robber** [ˈtʃə:tʃ.rɔbəʳ] *n* **1.** kilsə oğrusu; **2.** kafir, küfr edən, məlun, laməzhəb

**church-text** [ˈtʃə:tʃtekst] *n poliqr.* ingilis qotik şrifti

**church-ward** [ˈtʃə:tʃwɔ:d] *n tar.* kilsə gözətçisi / nəzarətçisi

**church-warden** [ˈtʃə:tʃˈwɔ:dn] *n* **1.** kilsə başçısı / ağsaqqalı; **2.** *d.d.* uzun qəlyan

**church-wardenship** [ˈtʃə:tʃˈwɔ:dnʃɪp] *n* kilsə başçısının vəzifəsi

**church-woman** [ˈtʃə:tʃˈwumən] (pl-women [-.wɪmɪn]) *n* qadın din xadimi, dindar / mövhumatçı qadın

**church-work** [ˈtʃə:tʃwə:k] *n* **1.** kilsə/məbəd tikintisində iştirak; **2.** *məc.* yavaş gedən / görülən iş

**churchy** [ˈtʃə:tʃɪ] *adj* **1.** mömin, dindar; **2.** ikiüzlü, riyakar

**churchyard** [ˈtʃə:tʃˈja:d] *n* qəbiristan *(kənddə)*, qəbiristan *(kilsə yanında)*;

◊ *A piece of a churchyard fits everybody at. söz.* ≅ *Hamının son məkanı qəbiristandır*

**churl** [tʃə:l] *n* **1.** qaba, kobud, nəzakətsiz, ədəbsiz, qanmaz, qanacaqsız, tərbiyəsiz *(adam)*; **2.** xəsis, simic, zıqqı; **3.** rəiyyət

**churlish** [ˈtʃə:lɪʃ] *adj* **1.** kobud, qaba, nəzakətsiz; ədəbsiz, qanmaz, tərbiyəsiz; ~ **reply** kobud /qaba cavab; **2.** xəsis, simic, acgöz, tamahkar; **3.** inad, inadlı, inadcıl, höcət, yolagəlməz; **4.** səmərəsiz, qoyulan zəhmətə dəyməyən *(iş və s. haq.)*; ~ **soil** səmərəsiz torpaq; **5.** *arx.* sadə xalq

**churlishly** [ˈtʃə:lɪʃlɪ] *adv* kobud, kobudcasına, qaba, qabacasına, nəzakətsiz; ədəbsiz, ədəbsiz bir tərzdə

**churlishness** [ˈtʃə:lɪʃnɪs] *n* kobudluq, qabalıq, ədəbsizlik, nəzakətsizlik

**churly** [ˈtʃə:lɪ] *adj* = **churlish**

**churn¹** [tʃə:n] *n* **1.** nehrə; **2.** bir şeyi qarışdırmaq üçün ağac və s.

**churn²** [tʃə:n] *v* **1.** çalxamaq *(nehrə)*; çalmaq *(yağ, yumurta və s.)*; **2.** qarışdırmaq, çalxamaq, çalmaq; **3.** köpüklətmək, köpükləndirmək, çalxayıb köpükləndirmək; **to** ~ **the water** *dən.* suyu eşib köpükləndirmək; *The wind churned the river to foam Külək çayın suyunu eşib köpükləndirdi*; **to** ~ **up** qazmaq, qazıb açmaq / çıxarmaq; eşələmək

**churning** [ˈtʃə:nɪŋ] *n* çalxama *(nehrə)*

**churn-milk** [ˈtʃə:nmɪlk] *n* yağ çalma

**churn-staff** [ˈtʃə:nsta:f] *n yumurta və s. çalmaq üçün ucu yaylı alət*

**churr¹** [tʃə:ʳ] *n* **1.** cırıldama, zırıldama; şırıltı; qurultu *(qarında)*; **2.** mırıltı *(it)*; **3.** vızıltı, vızıldama *(arı və s. haq.)*

**churr²** [tʃə:ʳ] *v* **1.** cırıldamaq; cırıldatmaq; cığıldamaq; vızıldamaq, zırıldamaq; **2.** şırıldamaq *(su və s.)*; **3.** quruldamaq *(qarın)*; **4.** mırıldamaq *(it)*; **5.** vızıldamaq *(arı)*; mızıldamaq; **6.** *tex.* titrəmək, əsmək; vibrasiya / titrəyiş əmələ gətirmək

**chute¹** [ʃu:t] *n* I **1.** qıjov, çayın iti axan yeri, selin gur axan yeri; **2.** sıldırım, uçurum, sərt eniş/yamac; **3.** təpə, kiçik dağ *(buzdan, ağacdan ibarət süni düzəldilmiş)*; **4.** enmə, düşmə, əskilmə, azalma; **5.** *tex.* zibil borusu

**chute** [ʃu:t] *n* II *d.d.* paraşüt



**chute²** [ʃu:t] *v* **1.** sürətlə tökülmək *(su və s.)*; **2.** dağdan / təpədən sürüşmək

**chutist** [ˈʃu:tɪst] *n d.d.* paraşütçü

**Cicero** [ˈsɪsərou] *n* **1.** Siseron; **2.** *şair.* gözəl / mahir natiq

**cider** [ˈsaɪdəʳ] *n* **1.** sidr *(alma şərabı)*; **2.** alma şirəsi; **3.** meyvədən hazırlanmış içki; **raspberry** ~ moruqdan hazırlanmış içki, moruq içkisi;

◊ *All talk and no cider amer. Səs-küy çox, amma faydası yox*

**cider-brandy** [ˈsaɪdə.brændɪ] *n* almadan hazırlanmış araq / likör

**ciderkin** [ˈsaɪdəkɪn] *n* almadan hazırlanmış içki

**cigarette¹** [.sɪgəˈret] *n* siqaret; papiros

**cigarette²** [.sɪgəˈret] *adj* siqaret, papiros; ~ **end** siqaret / papiros kötüyü

**cigarette-case** [.sɪgəˈretkeɪs] *n* portsiqar; papirosqabı

**cigarette-holder** [.sɪgəˈret.houldəʳ] *n* müştük

**cigarette-lighter** [.sɪgəˈret.laɪtəʳ] *n* alışqan, papirosyandıran

**cigarette-paper** [.sɪgəˈret.peɪpəʳ] *n* papiros kağızı

**cigar-holder** [sɪˈga:.houldəʳ] *n* siqar müştüyü

**cigar-shaped** [sɪˈga:ʃeɪpt] *adj* siqaraoxşar, siqarabənzər, siqarşəkilli, siqar kimi

**cilia** [ˈsɪlɪə] *n pl* **1.** *anat.* kirpiklər; **2.** *bot., zool.* kirpikcik

**cilice** [ˈsɪlɪs] *n* **1.** qıldan toxunmuş parça; **2.** qıldan toxunma dərviş paltarı

**cinch¹** [sɪntʃ] *n amer.* **1.** tapqır, qarınaltı; **2.** etibarlı, mötəbər, möhkəm, düz/doğru iş, əvvəlcədən məlum olan iş; *It is a cinch that horse will win the race Əvvəlcədən məlumdur ki, o at yarışı udacaq*; *It's a cinch Hər şey qaydasında olacaq*; **3.** asanlıqla görülmüş iş; *My examination was a cinch Mənim imtahanım halva yemək kimi idi*;

◊ **to have a** ~ **on smb.** bir kəsi itaətdə saxlamaq, bir kəsin cilovunu əldə saxlamaq

**cinch²** [sɪntʃ] *v* **1.** *amer.* tapqırı / qarınaltını bərkitmək; **2.** təmin etmək; möhkəmləndirmək; *The king cinched his party's victory in the election by imprisoning the opposition leaders Kral öz partiyasının seçkidəki qələbəsini müxalifət liderlərini həbs etməklə möhkəmlətdi*

**cinchona** [sɪŋˈkounə] *n bot.* kinə ağacı

**cinchona-bark** [sɪŋˈkounəba:k] *n əcz.* kinə ağacının qabığı

**cinchonic** [sɪŋˈkɔnɪk] *adj əcz.* kinə

**cinder¹** [ˈsɪndəʳ] *n* **1.** közərmiş kömür; qor; **2.** *pl* kül, kömür qırıntısı / xəkəsi; şlak; *Before making the fire remember to empty out yesterday's cinders Ocaq qalamazdan əvvəl dünənki külü boşaltmağı unutmayın; The volcano ejected cinders Vulkan kül püskürdü*; **3.** yanıq dəmir *(qızdırılmış metal üzərində əmələ gələn oksid)*; **4. (the ~s)** *id.* daş kömür külü tökülmüş yol

**cinder²** [ˈsɪndəʳ] *v* yandırmaq, yandırıb külə döndərmək

**cinder-box** [ˈsɪndəbɔks] *n tex.* küllük, kül yığılan qutu / qab

**cinder-path** [ˈsɪndəpa:θ] *n id.* daş kömür külü tökülmüş qaçış yolu

**cinder-pit** [ˈsɪndəpɪt] *n* **1.** = **cinder-box**; **2.** *d.y.* ocaqxana quyusu

**cindery** [ˈsɪndərɪ] *adj* **1.** kül; **2.** şlak

**cine-camera** [ˈsɪnɪˈkæmərə] *n* kinoaparat, kinokamera

**cine-film** [ˈsɪnɪfɪlm] *n* kino plyonkası

**cinema¹** [ˈsɪnɪmə] *n* **1.** kino, kinematoqrafiya *(kino işləri)*; *He's worked in the cinema all his life O, bütün ömrü boyu kinoda işləyib*; **amateur** ~ həvəskar kino; **2.** kinoteatr; kino; *Let's go to the cinema tonight Gəl/Gəlin bu axşam kinoya gedək*

**cinema²** [ˈsɪnɪmə] *adj* kino; ~ **hall** kinozal; ~ **manager** kinoteatrın direktoru; ~ **theatre** kinoteatr

**cinemactor** [ˈsɪnɪm.æktəʳ] *n amer.* kino aktyoru

**cinemactress** [ˈsɪnɪm.æktrɪs] *n amer.* kino aktrisası

**cine-magazine** [ˈsɪnɪ.mægəˈzi:n] *n* kinojurnal

**cinema-goer** [ˈsɪnɪmə.gouəʳ] *n* kino həvəskarı, kinosevər

**cinemascopic film** [ˈsɪnɪmə.skɔpɪkˈfɪlm] *n* genişekranlı film

**cinematic** [.sɪnɪˈmætɪk] *adj* kinematoqraf, kinematoqrafiya

**cinematography** [.sɪnɪməˈtɔgrəfɪ] *n* **1.** kino, kinematoqrafiya *(kino işləri)*; **2.** film çəkmə; **stop-motion / high speed** ~ yavaşıdılmış / sürətləndirilmiş film çəkmə; **3.** operator peşəsi

**Cinerama** [.sɪnɪˈra:mə] *n* sinerama *(genişekranlı kino sistemlərindən biri)*

**cinerarium** [.sɪnəˈreərɪəm] *n (pl* **-ria**) *lat.* kolumbari *(krematoriyada yandırılmış meyitin külü olan qabların saxlanıldığı yer)*

**cinerary** [ˈsɪnərərɪ] *n* dəfn urnası *(yandırılmış meyitin külünü saxlamaq üçün vazşəkilli qab)*

**cinerator** [ˈsɪnəreɪtəʳ] *n* krematori *(meyit yandırılan bina)*

**cinereous** [sɪˈnɪərɪəs] *adj* kül rəngi, kül

**Cingalese** [.sɪŋgəˈli:z] *n* **1.** sinqallı, Sinqal vətəndaşı; **the** ~ *top.i* sinqallılar; **2.** Sinqal dili

**Cingalese** [.sɪŋgəˈli:z] *adj* **1.** Sinqal; **2.** *arx.* seylon

**cingle** [ˈsɪŋgl] *n* **1.** toqqa, qayış, kəmər; **2.** tapqır, qarınaltı

**cinnamon** [ˈsɪnəmən] *n* **1.** *bot.* darçın, darçın ağacı; **2.** açıq qəhvəyi / xurmayı rəng, darçını rəng, darçın rəngi

**cipher¹** [ˈsaɪfəʳ] *n* **1.** *riyaz.* sıfır; **2.** cüzilik; heçlik, heç bir əhəmiyyəti olmayan adam; *He is a cipher O, boş/mənasız adamdır*; **to stand for** ~ tam əhəmiyyətsiz olmaq; **3.** şifr, kriptoqrafiya *(şərti gizli yazı, kod)*; **in** ~ şifrlənmiş, şifr qoyulmuş; **to translate into** ~ şifrləmək, şifrlə yazmaq; **to translate out of** ~ şifrini açmaq. **4.** ərəb rəqəmi; **5.** monoqram *(bir neçə baş hərfin hörgü şəklində bir-birinə keçirilməsi)*, venzel

*(ad və familiyanın baş hərflərinin bir-birinə keçirilərək qəşəng yazılışı)*

**cipher**[2] ['saıfə$^{r}$] *adj:* ~ **code** şifrləmə kodu; ~ **device** şifrləmə maşını; ~ **officer/clerk** şifr qoyan, şifrləyici; ~ **text** şifrlənmiş mətn

**cipher**[3] ['saıfə$^{r}$] *v* **1**. hesablamaq, hesablayıb tapmaq; yekun vurmaq; rəqəmlərlə əməliyyat aparmaq; **to read, to write and** ~ oxumaq, yazmaq və hesablamaq; **2**. şifrini açmaq / tapmaq / yazmaq; **to** ~ **out** *amer. d.d.* ətraflı düşünmək; götür-qoy etmək, ölçüb-biçmək

**ciphered** ['saıfəd] *adj* şifrlənmiş, şifr qoyulmuş; ~ **message** şifrlənmiş məlumat; ~ **code 1)** şifrlənmiş kod; **2)** rəqəmlərlə göstərilmiş kod

**cipherer** ['saıfərə$^{r}$] *n* şifrləyici, şifr qoyan / yazan

**cipher-key** ['saıfəkı:] *n* şifrin / kodun açarı

**Circassian**[1] [sə:'kæsıən] *n* **1**. çərkəz; **the** ~**s** *top.i* çərkəzlər; **2**. çərkəz dili

**Circassian**[2] [sə:'kæsıən] *adj* çərkəz; **the** ~ **language** çərkəz dili

**circle**[1] ['sə:kl] *n* **1**. dairə; dövrə; **to move in** ~**s** hərlənmək, dolanmaq, fırlanmaq, dövrə vurmaq; *The aeroplane made two circles and landed Təyyarə iki dövrə vurub yerə endi;* **2**. halqa; dövrələnmə, dövrəyə alma, əhatə, əhatəyə alma/alınma; **in a** ~ **of trees /of hills** ağacların / təpələrin əhatəsində; **3**. sahə, dairə; **a wide** ~ **of interests** geniş maraq dairəsi / sahəsi; **within the** ~ **of possibilities** imkan dairəsində; **4**. əhatə, mühit; dairə; **family** ~ ailə mühiti/əhatəsi; **a** ~ **of friends** dostların əhatəsi; *The circle of his acquaintance widened Onun dostlarının dairəsi genişləndi;* **5**. dərnək; **a sewing** ~ tikmə/tikiş dərnəyi; **6**. *pl* dairələr; **ruling** ~**s** hökmdar dairələr; **political** ~**s** siyasi dairələr; *In political circles there is talk of war Siyasi dairələrdə müharibə haqqında söhbət gedir;* **business** ~**s** işgüzar dairələr; 7. dövran, dövr etmə; dəyişmə, bir-birini əvəz etmə; ~ **of seasons** fəsillərin dövranı / bir-birini əvəz etməsi; **to come full** ~ dövrə vurmaq, tam dövr etmək; **8**. nazik haşiyə, nazik dairə, kiçik halqa, çənbər; parlayan dairə *(ayın ətrafında);* **9**. *teatr.* yarus *(teatr binasının içərisindəki mərtəbə);* **dress** ~ beletaj *(teatrda ikinci mərtəbədə lojalar);* **parquet** ~ amfiteatr *(teatrda parterin dalında və ya lojaların üstündə pillə-pillə yüksələn yerlər);* **family/upper** ~ yuxarı yarus/ balkon; **10**. sirkin səhnəsi / meydanı; **11**. *astr.* orbit; disk *(ayın və s. göy cisimlərinin ətrafındakı dairə);* **12**. *id.* atmaq üçün dairə *(nizə və s.)*;
◊ **to square the** ~ **1)** dairənin kvadraturasını hesablamaq; **2)** mümkün olmayan işlə məşğul olmaq

**circle**[2] ['sə:kl] *v* **1**. hərlənmək, fırlanmaq, dairə boyunca hərəkət etmək, dövrə vurmaq, dolanmaq; hərlətmək, fırlatmaq; **to** ~ **the Earth** yer kürəsi ətrafına fırlanmaq / dolanmaq; *The Sputnik circled the Earth several thousand times Sputnik yer ətrafında bir neçə min dəfə fırlandı /hərləndi/dövrə vurdu; The birds circled around in the air Quşlar havada dövrə vurdu/fırlandı*; **2**. dairələmək, dairəyə almaq; *The teacher circled the pupils' spelling mistakes in red ink Müəllim şagirdlərin imla səhvlərini qırmızı mürəkkəblə dairəyə aldı*; **3**. dolaşmaq, arasında olmaq; **to** ~ **among the voters** seçicilərin arasında dolaşmaq; **to** ~ **around** *av.* aerodrom üzərində dövrə vurmaq / fırlanmaq; *The plane circled around before landing Yerə enməzdən əvvəl təyyarə aerodrom üzərində dövrə vurdu*

**circled** ['sə:kld] *adj* **1**. dövrələnmiş, mühasirəyə alınmış, əhatə edilmiş, araya alınmış; **2**. girdə, dəyirmi, yumru; **3**. dairə ilə qeyd edilmiş, dairələrlə örtülmüş *(parçada)*

**circlet** ['sə:klıt] *n* **1**. dairəcik; **2**. çiçək tacı, çələng, əklil; diadema, çutqabağı, başlıq *(qadınların başlarına qoyduğu tacşəkilli daş-qaşlı bəzək)*; ~ **of flowers** çiçək çələngi; **3**. nur, halə, parıltı, şəfəq; **4**. üzük; **5**. bilərzik, qolbaq; **6**. boyunbağı, həmail

**circle-wise** ['sə:klwaız] *adv* dairəvi olaraq, dairəvi tərzdə

**circling** ['sə:klıŋ] *n id.* dairəvi hərəkət, dönüş; dövr, dönmə

**circuit**[1] ['sə:kıt] *n* **1**. dövr, dolanma, dövr etmə; dövri hərəkət; dairəvi hərəkət; **the Moon's** ~ **of the Earth** ayın yer ətrafına dolanması /fırlanması; **2**. çevrə; çevrənin uzunluğu; ~ **of the globe** yer kürəsinin çevrəsi / çevrəsinin uzunluğu; **the** ~ **of the city walls** şəhər divarlarının ümumi uzunluğu; **3**. gəzib dolanma, baş çəkmə, yoxlama; dolama yol; turne; səyahət, marşrut; *The commanding officer made a circuit of the camp Komandir düşərgəni gəzib dolandı/yoxladı;* **a postman's** ~ poçtalyonun adi/həmişəki marşrutu; *Theatre companies travel over regular circuits Teatr truppaları müntəzəm olaraq qastrollara gedirlər;* **4**. *hüq.* məhkəmənin səyyar sessiyası; *Judges go on circuit for part of the year İlin bir hissəsini hakimlər səyyar sessiyaya gedirlər;* **5**. sahə, dairə *(fəaliyyət haq.)*; **6**. dövr, dövrə; silsilə; **7**. şəbəkə; sxem; sistem; **theatre** ~ teatrlar şəbəkəsi; **8**. *el. rad.* dövrə, kontur; **short** ~ qısa qapanma; **open** ~ açıq kontur / dövrə; **9**. *av.* dairəvi uçuş; **10**. dolanıb getmə / keçmə; dolama yol; **to fetch / to take / to make** ~ dolama yolla getmək

**circuit**[2] ['sə:kıt] *v* **1**. dolanmaq *(ətrafına)*, dövrə vurmaq; ətrafından keçmək, yanından dolanmaq / ötmək; **to** ~ **the globe** yer kürəsini dolanmaq, yer kürəsi ətrafında dövrə vurmaq; **2**. dairə vurmaq, fırlanmaq, hərlənmək, dolanmaq

**circuiteer** [.sə:kı'tıə$^{r}$] *n* **1**. bir yeri / rayonu gəzib



dolanan şəxs; agent qastrolçu, kommivoyajor *(xarici ölkələrdə ticarət agenti);* **2**. səyyar məhkəmənin hakimi və ya vəkili

**circuiter** ['sə:kıtə$^{r}$] *n* = **circuiteer**

**circuition** [.sə:kju:'ıʃn] *n arx.* **1**. dolanma, yanından ötmə / keçmə, dəymə; dairəvi hərəkət; ətrafına fırlanma / dolanma; **2**. lüzumsuz söz, yersiz təfsilat

**circuitous** [sə:'kju:ıtəs] *adj* dolanbac, dolayı, dolama *(yol, çay və s. haq.);* **the river's** ~ **course** çayın dolanbac axını

**circuitously** [sə:'kju:ıtəslı] *adv* dolayı/dolama yolla; bilavasitə

**circuity** [sə:'kjuıtı] *n* **1**. dairə üzrə hərəkət; **2**. uzanma, yubanma, ləngimə; ~ **of action** məhkəmə istintaqının uzanması / uzun çəkməsi / ləngiməsi

**circular**[1] ['sə:kjulə$^{r}$] *n* **1**. sirkulyar, direktiv, göstəriş, əmr, sərəncam; məktub; *Did you see that circular from the government telling us about their attack on high prices? Sən/Siz dövlətin qiymətləri qaldırmaq haqqındakı direktivini gördünmü / gördünüzmü?;* **2**. reklam, elan, ticarət preyskurantı *(evlərə göndərilən)*

**circular**[2] ['sə:kjulə$^{r}$] *adj* **1**. girdə, dəyirmi, yumru, dolama; ~ **pool/tower** girdə/dəyirmi çarhovuz/qüllə; ~ **staircase** dolama pilləkən; ~ **saw** *tex.* dairəvi mişar; **2**. dairə üzrə fırlanan, dairəvi; ~ **motion** dairəvi hərəkət; ~ **trip/tour** dairəvi turne/marşrut; **3**. dolanbac, dolama, dolayı *(yol, cavab və s. haq.); Stop giving me circular explanation and tell me what really happened Dolayı cavabı saxla / saxlayın, mənə de/deyin görüm həqiqətdə nə baş verib*

**circularity** [.sə:kju'lærıtı] *n* **1**. dairəvilik, dairəşəkillilik; dairə formalı; **2**. girdəlik, dəyirmilik, yumruluq; **3**. dolayılıq, dolanbaclıq

**circularization, -isation** [.sə:kjulərаı'zeıʃn] *n* **1**. məktubların dövri şəkildə göndərilməsi; **2**. üzü çıxarılmış sənədlərin yayılması; **3**. reklamların /ticarət preyskurantlarının göndərilməsi *(evlərə)*

**circularize, -ise** ['sə:kjulərаız] *v* **1**. göndərmək, yollamaq *(reklam, prospekt və s.);* **2**. girdə / yumru şəklə salmaq, girdələmək, dəyirmiləmək

**circulate** ['sə:kjuleıt] *v* **1**. dairəvi hərəkətə malik olmaq; dövr etmək, dövran etmək; dolaşmaq; **2**. yayılmaq; əldən-ələ keçmək / düşmək, ağızdan-ağıza düşmək; *Bad news circulates quickly Pis / Qara xəbər tez yayılır;* **3**. yaymaq, göndərmək, vermək; **to** ~ **a document** sənəd göndərmək/yaymaq; **to** ~ **a loving-cup** qədəhi / badəni bir-birinə ötürərək içmək; **4**. *mal.* dövriyyədə olmaq *(vəsait haq.);* **5**. *tex.* dairəvi hərəkət etmək *(istilik sistemində buxarın hərəkəti haq.);* **6**. *riyaz.* təkrar olunmaq *(dövri kəsrdə rəqəmlər haq.)*

**circulating** ['sə:kjuleıtıŋ] *adj* **1**. dövriyyə; dövriyyədə/ tədavüldə olan; ~ **assets** *iqt.* dövriyyə vəsaiti; ~ **notes** *mal.* banknot *(bank tərəfindən buraxılan faizsiz kredit bileti);* ~ **medium** *mal.* ödəmə vəsaiti; **2**.: ~ **library** evə kitab verən kitabxana; ~ **department** abonement şöbəsi; ~ **book** evə verilən kitab *(kitabxanadan);* **3**.: ~ **decimal** *riyaz.* dövri kəsr

**circulation**[1] ['sə:kju'leıʃn] *n* **1**. dövr etmə, dövr, dövran; **air** ~ havanın dövranı/dövr etməsi; **2**. *arx.* dövran, dairəvi hərəkət; hərlənmə, fırlanma; **3**. yayma, yayılma; intişar; ötürmə *(şayiəni və s.);* **4**. tiraj *(qəzet və s.); This paper has a circulation of more than a million Bu qəzetin tirajı milyondan artıqdır;* **5**. *mal.* tədavül; ~ **of money** pulun tədavülü; ~ **of commodities** malların tədavülü; **to withdraw from** ~ tədavüldən çıxartmaq; **to put into** ~ tədavülə buraxmaq *(pulu);* **6**. vermə *(kitabı);* **7**. *fiziol.*: ~ **of blood** qan dövranı; **poor** ~ **of blood** pis qan dövranı

**circulation**[2] [.sə:kju'leıʃn] *adj:* ~ **desk** abunəçi stolu *(kitabxanada);* ~ **file** kitab kartotekasının formulyarı *(kitabxana kartoçkası)*; ~ **period** verilmə müddəti *(kitabın kitabxanadan evə);* ~ **department** abonement şöbəsi *(kitabxanada);* ~ **map** marşrut xəritəsi

**circulator** ['sə:kjuleıtə$^{r}$] *n* **1**. yayan *(şayiəni və s.)*; ~ **of infection** *tib.* yoluxucu xəstəlik yayan; **2**. *riyaz.* dövri kəsr; **3**. *arx.* səyahətçi, səyyah, yolçu

**circulatory** ['sə:kjuleıtərı] *adj* **1**. dövr edən; keçən, keçici, keçmə; **2**. dövr; **3**. *fiziol.* qandaşıyan; ~ **disease** *tib.* qan dövranı orqanlarının xəstəliyi; **4**. *arx.* dairəvi, girdə, dairəşəkilli; **5**. *arx.* şarlatan, şarlatanlıq

**circumcise** ['sə:kəmsaız] *v* **1**. *din.* sünnət etmək; **2**. *tib.* dairəvi kəsmək

**circumcision** [.sə:kəm'sıʒn] *n* **1**. *din.* sünnət, sünnət etmə; **2**. *tib.* dairəvi kəsmə

**circumduct** [.sə:kəm'dʌkt] *v hüq.* ləğv/ rədd etmək, geri götürmək

**circumduction** [.sə:kəm'dʌkʃn] *n* **1**. dövri hərəkət; **2**. *hüq.* ləğv / rədd etmə

**circumference** [sə'kʌmfərəns] *n* **1**. *riyaz.* çevrə; **orbit** ~ orbitin uzunluğu; *The earth's circumference is nearly 25.000 miles Yer kürəsi orbitinin uzunluğu təxminən 25.000 mildir;* **2**. ətraf, ətraf yerlər; **3**. həcm; ~ **of chest** döş qəfəsinin həcmi

**circumferential** [sə.kʌmfə'renʃl] *adj* **1**. *riyaz.* çevrəyə dair/aid olan; çevrə; **2**. dairəvi *(yol haq.)*

**circumflex**[1] ['sə:kəmfleks] *n dilç.* saitlərin üstünə qoyulan diakritik işarələr *(saitlərin səsini dəyişdirmək üçün onların üstündə qoyulan işarələr, məs. Azərbaycan türkcəsində ö, ü hərflərinin üstünə qoyulan iki nöqtə)*

**circumflex**[2] ['sə:kəmfleks] *v* əyib geydirmək /keçirtmək; qurşamaq, dolamaq; dolanıb keçmək

**circumflexion** [.sə:kəm'flekʃn] *n* əyrilik, əyri əyilmiş yer, bükük, əyri

**circumfluence** [sə'kʌmfluəns] *n* 1. yanından ötüb keçmə; 2. yuma, yuyulma, yuyub təmizləmə; 3. dövrələmə, dövrəyə alma, dövrələnmə, dövrəyə alınma; 4. *tib.* bürümə, qaplama, çulğalama, əhatə etmə; udma, yeyilmə; canına çəkmə
**circumfluent** [sə'kʌmfluənt] *adj* yapışan *(bədənə)*, əhatə edən, yuyan, yuyub təmizləyən
**circumfluous** [sə'kʌmfluəs] *adj* 1. su ilə əhatə olunmuş / edilmiş, su ilə yuyulan; 2. = **circumfluent**
**circumforaneous** [ˌsə:kəmfə'reınıəs] *adj arx.* sərsəri kimi gəzən / dolanan, sərsəri həyat keçirən; gəzən, bir yerdə qərar tutmayan, daim yerini dəyişən *(ticarətçi, fırıldaqçı, yalançı və s. haq.)*
**circumjacence** [ˌsə:kəm'dʒeısəns] *n* 1. dövrələmə, dövrəyə / mühasirəyə alma / alınma, dövrələnmə; 2. ətraf, ətraf yerlər
**circumjacency** [ˌsə:kəm'dʒeısənsı] *n* = **circumjacence**
**circumjacent** [ˌsə:kəm'dʒeısənt] *adj* dövrələyən, əhatə edən; ətrafda yerləşən / yerləşmiş; hər tərəfdən dövrəyə alan; ətraf, ətrafdakı
**circumjovial** [ˌsə:kəm'dʒouvjəl] *adj astr.* yupiterin ətrafına fırlanan / dolanan
**circumlittoral** [ˌsə:kəm'lıtərəl] *adj* sahil boyu, sahil boyundakı, sahil boyunda olan
**circumlocution** [ˌsə:kəmlə'kju:ʃn] *n* 1. sözçülük, uzunçuluq; boşboğazlıq, naqqallıq, lağlağılıq; 2. ikimənalı / qeyri-səmimi nitq; 3. kinayə, eyham, məcaz; parafraz *(bir ifadə və ya sözün mənasının təsviri ifadəsindən ibarət olan təbir)*
**circumlocutional** [ˌsə:kəmlə'kju:ʃənl] *adj* 1. çoxdanışan, çox danışmağı sevən, uzunçu; qəliz, təmtəraqlı; uzun, uzundanışan; 2. qeyri-müəyyən, qeyri-səmimi, ikimənalı
**circumlocutory** [ˌsə:kəm'lɔkjutərı] *adj* 1. uzunçu, uzundanışan *(adam)*; 2. təsviri
**circumlunar** [ˌsə:kəm'lju:nəʳ] *adj astr.* ayətrafı, ayın ətrafına dolanan / fırlanan; ~ **rocket** ayın ətrafına dolanıb yerə qayıdan raket
**circum-meridian** [ˌsə:kəmmə'rıdıən] *adj* meridiana yaxın / yaxın olan
**circumnavigate** [ˌsə:kəm'nævıgeıt] *v* ətrafında üzmək; **to ~ the globe / the earth** yer kürəsi / yer ətrafına gəmi ilə səyahət etmək; **to ~ the world** dövr-aləm / dünya səyahətinə çıxmaq
**circumnavigation** ['sə:kəmˌnævı'geıʃn] *n* dövraləm səyahəti *(gəmi ilə)*
**circumnavigator** ['sə:kəm'nævıgeıtəʳ] *n* gəmi ilə dövr-aləm səyahətinə çıxan
**circumnavigatory** ['sə:kəm'nævıgeıtərı] *adj* dövr-aləm
**circumpolar** [ˌsə:kəm'pouləʳ] *adj* 1. *coğ.* qütb dairəsi yaxınlığında olan, qütbə yaxın; 2. *astr.* qütbətrafı, qütbə yaxın; ~ **star** qütbə yaxın ulduz
**circumrotation** [ˌsə:kəmrou'teıʃn] *n* 1. fırlanma, dolanma *(öz oxu ətrafına)*; hərlənmə, dövr etmə; 2. tam dövrə / dövr

**circumrotatory** [ˌsə:kəmrou'teıtərı] *adj* 1. fırlandırıcı; dövri; hərlənən, fırlanan; 2. tam dövr edən
**circumscribe** ['sə:kəmskraıb] *v* 1. çevrəsini cızmaq / çəkmək; dövrəsinə xətt çəkmək; dairəyə almaq; *The teacher asked the pupils to circumscribe the square Müəllim şagirdlərə dedi ki, kvadrat çəksinlər;* 2. məhdud etmək, məhdudlaşdırmaq, hədd qoymaq; *His activities have been severely circumscribed since his illness Xəstəliyi onun fəaliyyətini kəskin surətdə məhdudlaşıb*
**circumscription** [ˌsə:kəm'skrıpʃn] *n* 1. çevrə, sərhəd; hədd, hüdud; 2. sərhədi / həddi / hüdudu müəyyənləşdirmə, hədd / hüdud / sərhəd qoyma; hüdudlaşdırma, məhdudlaşdırma *(hüququ və s.)*; **to put into ~** sıxmaq, sıxışdırmaq; təzyiq etmək; məhdudlaşdırmaq, əl-qolunu bağlamaq; 3. rayon; sahə, mahal, dairə; 4. dövrəsindəki yazı *(dəmir pulun, markanın)*; 5. mühit, vəziyyət, şərait; 6. *arx.* təyin / müəyyən etmə; tərif, təyin edilmə
**circumspect** ['sə:kəmspekt] *adj* 1. ehtiyatlı, ehtiyatkar, ehtiyatlı / ehtiyatla hərəkət edən; 2. hər şeyi əvvəldən görən, hər şeyə fikir verən
**circumscriptive** [ˌsə:kəm'skrıptıv] *adj* məhdudlaşdırıcı, məhdudiyyət qoyan
**circumstance**[1] ['sə:kəmstəns] *n* 1. *pl* vəziyyət, şərait, işlərin vəziyyəti, şərt; **under the ~s** bu vəziyyətdə / bu halda, belə halda / vəziyyətdə; *I wanted to leave quickly but under the circumstances (my uncle had just died) I decided to stay another night Mən tezliklə getmək istəyirdim, lakin vəziyyət (dayım rəhmətə getmişdi) məni bir gecə də qalmağa məcbur etdi;* **under / in no ~s** heç, heç bir halda / vəziyyətdə, heç vaxt; **unforeseen ~** gözlənilməz hal/vəziyyət; *Circumstances alter cases Hər şey vəziyyətdən / şəraitdən asılıdır; The circumstances forced me to accept a very low price when I sold the house Evi satanda vəziyyət məni məcbur etdi ki, çox aşağı qiyməti qəbul edim /qiymətlə razılaşım;* 2. hadisə, təsadüf; əhvalat; *He was the victim of circumstances O, təsadüfün/qəzanın qurbanı oldu;* **lucky ~** xoşbəxt təsadüf; 3. təfsilat, təfərrüat; **to omit no essential ~** lazım olan heç bir şeyi buraxmamaq; 4. ətraflılıq, mükəmməllik, təfərrüat, dolğunluq; *The story was told with great circumstance Əhvalat tam təfərrüatı ilə nəql edildi;* 5. həyat, mühit; **creature of ~s** mühitin məhsulu *(insan haq.)*; **the blows of ~s** həyatın / taleyin zərbələri; 6. *sing.* təmtəraq, ehtişam, dəbdəbə, cəlal, büsat; mərasim; **to receive with ~** dəbdəbə ilə / ehtişamla qəbul etmək; **pride, pomp and ~ of glorious war** *(Shakespeare)* döyüşün alovu və qələbənin təntənəsi/ təmtəraqı;
◊ **more ~** *amer.* 1) sıfır, heç bir şeyə dəyməyən adam; 2) heç şeyə yaramayan şey, əhəmiyyəti olmayan şey



**circumstance**[2] ['sə:kəmstəns] *v* 1. müəyyən vəziyyətə salmaq; 2. *arx.* detallaşdırmaq; təfsilatı ilə göstərmək, təfərrüata varmaq
**circumstantial**[1] [ˌsə:kəm'stænʃəl] *n* 1. *(əsas. pl)* təfsilat, təfərrüat; 2. *pl* təsadüfi /kənardan daxil olmuş şərtlər; ikinci dərəcəli şərtlər / xüsusiyyətlər
**circumstantial**[2] [ˌsə:kəm'stænʃəl] *adj* 1. müfəssəl, ətraflı, dolğun, təfsilatlı; ~ **report** ətraflı / müfəssəl / dolğun məruzə; 2. təsadüfi, gözlənilməyən, kənar *(vəziyyət, şərait haq.)*; **things essential and things ~** zəruri / mühüm və əhəmiyyətsiz / ikinci dərəcəli şeylər; əbədi və müvəqqəti / fani; 3. vəziyyətdən asılı olan; 4. *hüq.* dolayı; ~ **evidence** dolayı sübut / dəlil
**circumstantiality** [ˌsə:kəmˌstænʃı'ælıtı] *n* 1. ətraflılıq, mükəmməllik, dolğunluq; 2. təfsilat, təfərrüat
**circumstantially** [ˌsə:kəm'stænʃəlı] *adv* 1. müfəssəl, ətraflı, təfsilatilə, təfərrüatı ilə, ətraflı /müfəssəl surətdə; 2. təsadüfən, ittifaqən, təsadüfi, bilmədən, təsadüfi olaraq; 3. bilvasitə, dolayısilə; ~ **proved** *hüq.* dolayı dəlillərlə sübuta yetirilən
**circumvent** [ˌsə:kəm'vent] *v* 1. aldatmaq, çaşdırmaq; tovlamaq; 2. tora salmaq, aldatmaq, kələk gəlmək; *The king tried to circumvent his enemies in the government, but his plan failed and he lost his crown Kral çalışdı ki, hakimiyyətdə olan düşmənlərinə kələk gəlsin, lakin onun planı baş tutmadı və o, tacını itirdi;* 3. fikir verməmək; pis vəziyyətdə qoymaq; 4. pəl vurmaq, şətəl qatmaq, dağıtmaq, pozmaq *(planı)*; 5. dövrələmək, əhatə etmək, mühasirəyə almaq; bürümək
**circumvention** [ˌsə:kəm'venʃn] *n* 1. aldatma, aldanma; yalan, kələk, fırıldaq; 2. biclik, fənd, hiyləgərlik, yalançılıq
**circumvolation** [ˌsə:kəmvə'leıʃn] *n* uçma, uçuşma, pərvaz etmə, pırıldayıb uçma
**circumvolute** [ˌsə:kəmvə'lju:t] *v* 1. burmaq; eşmək, fırlatmaq; fırlandırmaq, hərləndirmək; dolamaq; 2. sarımaq, bürümək, çulğalamaq
**circumvolution** [ˌsə:kəmvə'lju:ʃn] *n* 1. əyrilik, əyri-üyrülük; girinti-çıxıntı; döngə, dirsək; 2. hərlənmə, hərlətmə; fırlanma, fırlatma; 3. dövr, dönmə, döndərilmə; 4. dolama yol; hiylə, biclik; 5. lüzumsuz söz, yersiz təfsilat; 6. fırlanma, dolanma *(ümumi mərkəz ətrafında)*
**circus**[1] ['sə:kəs] *n* 1. sirk; 2. səhnə, meydan; manej *(sirkdə)*; 3. sirk tamaşası; 4. *arx.* dairə; halqa
**circus**[2] ['sə:kəs] *adj* sirk; ~ **performer** sirk artisti; ~ **horse** sirk atı
**cirque** [sə:k] *n* 1. = **circus**; 2. *şair.* amfiteatr; arena, meydan; 3. dairə, halqa; 4. *geol.* dağda buzlaq
**cirrhosis** [sı'rousıs] *n tib. bayt.* sirroz
**cirrose** ['sırous] *adj* 1. bığcığı olan *(həşarat və bitki haq.)*; 2. kəkili olan, kəkilli *(quş haq.)*; 3. çox yüksəkdə olan yarımşəffaf uzunsov *(bulud haq.)*; 4. *amer.* yumşaq, tüklü, sıx, gur *(saç və s. haq.)*

**cirrus** ['sırəs] *n (pl cirri)* 1. bığcıq *(həşərat və bitkidə)*; 2. kəkil, tomağa *(quşlarda)*; 3. yüksəkdə olan yarımşəffaf uzunsov bulud
**cislunar** [sıs'lu:nəʳ] *n* yer və ay arasında olan məkan
**cistern** ['sıstən] *n* 1. bak *(su, benzin və s. üçün böyük qab)*; 2. rezervuar, çən *(maye və qaz üçün)*; 2. nohur, hovuz; su anbarı; 3. *arx.* kasa, cam, piyalə; badə; krujka, parç
**citable** ['saıtəbl] *adj* əsas verən, etibarlı *(mənbə, müəllif və s. haq.)*
**citadel** ['sıtədl] *n* 1. iç qala, bürc, istehkam; qala; 2. istinadgah; dayaq; *Our country has become a citadel of freedom in the modern world Bizim vətənimiz müasir dünyada azadlığın dayağına çevrilib;* 3. sığınacaq, daldalanacaq *(yer)*, pənahgah
**citation** [saı'teıʃn] *n* 1. sitat gətirmə/gətirilmə; əsaslanma, istinad etmə; 2. sitat, dəlil; 3. sadalama; bir-bir sayma/sayılma; ~ **of facts** faktların sadalanması, faktları sadalama; 4. *hüq.* çağırış, çağırma *(məhkəməyə)*; 5. *amer. hərb.* təşəkkür elan etmə; mükafat almanın/təltif edilmənin elanı; **to award a ~** əmrlə təşəkkür elan etmək; **to get a ~** əmrlə təşəkkür almaq
**citatory** ['saıtətrı] *adj* mənbə ilə təsdiq edilmiş, mənbəyə əsaslanan, sitat/dəlil gətirilən, isnad edilən, sitat tərzində verilən
**cite** [saıt] *v* 1. əsaslanmaq, istinad etmək; **to ~ law** qanuna əsaslanmaq; **to ~ an instance** misal gətirmək/vermək; **the facts just ~d** yuxarıda göstərilmiş faktlar/dəlillər; **to ~ the circumstances** vəziyyəti/şəraiti şərh etmək; 2. sitat gətirmək; **to ~ a passage** bir parçanı sitat gətirmək; 3. sadalamaq, bir-bir demək/yada salmaq; 4. *hüq.* məhkəməyə çağırmaq *(müttəhim və ya şahid kimi)*; 5. *amer.* məhkəmə məsuliyyətinə cəlb etmək, məhkəməyə vermək; *He was cited for contempt of court Məhkəməni təhqir etdiyi üçün o, məhkəmə məsuliyyətinə cəlb olundu;* 6. *şair.* çağırmaq; **to ~ to the field** döyüş meydanına çağırmaq; 7. *amer. hərb.* əmrdə və ya məlumatda qeyd etmək *(fərqlənən hərbçiləri)*; *He was cited for bravery under fire Döyüş xidmətlərinə görə o, təşəkkür aldı*
**citeable** ['saıtəbl] *adj* = **citable**
**citess** ['sıtəs] *n arx.* şəhərli qadın / qız, nərmənazik, əlini ağır işə vurmayan
**citified** ['sıtıfaıd] *adj* şəhər, şəhərsayağı *(paltar, davranış haq.)*
**citify** ['sıtıfaı] *v* 1. şəhər görkəmi vermək, şəhər görkəminə salmaq; 2. *məc.* yonmaq, rəndələmək *(kənd əhlini)*
**citish** ['sıtıʃ] *adj* şəhər, şəhərsayağı *(davranış, geyim haq.)*
**citizen** ['sıtızn] *n* 1. vətəndaş; **fellow ~s** həmvətənlər; **Azerbaijan ~** Azərbaycan vətəndaşı; **to be a ~ of Azerbaijan** Azərbaycan vətəndaşı olmaq; a

**British** ~ Britaniya vətəndaşı; *She is a British citizen but lives in Azerbaijan O, Britaniya vətəndaşıdır, lakin Azərbaycanda yaşayır*; 2. şəhər sakini / əhli; **a ~ of Boston** Boston sakini; 3. əhali *(xüs. seçki yaşına çatmış)*; mülki; **a mass meeting of ~s** əhalinin kütləvi mitinqi / toplanışı

**citizenhood** ['sıtıznhud] *n* 1. = **citizenship**; 2. *top.i.* vətəndaşlar

**citizenry** ['sıtıznrı] *n top.i.* vətəndaşlar; əhali, camaat

**citizenship** ['sıtıznʃıp] *n* 1. vətəndaşlıq; **to be admitted to ~** vətəndaşlığa qəbul olunmaq, vətəndaşlıq verilmək; **to loose** *one's* **~** vətəndaşlığını itirmək, vətəndaşlıqdan məhrum olmaq; **to apply for ~** vətəndaşlıq almaq üçün müraciət etmək / ərizə vermək; 2. vətəndaşlıq hüququ və vəzifələri, öz hüquq və vəzifələrini dərk etmə

**citizens-in-arms** ['sıtıznzın'a:mz] *n* yığma qoşun *(nizami qoşuna kömək etmək üçün könüllü surətdə düzəldilən xüsusi təyinatla polis dəstəsi)*

**citrate** ['sıtreıt] *n kim.* sitrat, limon turşusu duzu

**citreous** ['sıtrıəs] *adj* limon, limon rəngi

**citric** ['sıtrık] *adj kim.* limon; **~ acid** limon turşusu

**citriculturist** [ˌsıtrı'kʌltʃrıst] *n* sitrus bitkiləri ilə məşğul olan mütəxəssis

**citron** ['sıtrən] *n bot.* sitrus bitkiləri *(limon, naringi, portağal və s.)*

**citrus** ['sıtrəs] *adj* sitrus; **~ fruits** sitrus meyvələri; *I love eating citrus fruits Mən sitrus meyvələri yeməyi xoşlayıram*

**city**[1] ['sıtı] *n* 1. şəhər, böyük şəhər *(İngiltərədə)*; bələdiyyə, bələdiyyə idarəsi olan şəhər *(ABŞ-da)*; **to live in the ~** şəhərdə yaşamaq; **in the ~ of Baki** Bakı şəhərində; **capital ~** mərkəz şəhər, paytaxt; **free ~** azad şəhər; 2. **the City** Siti *(Londonun işgüzar hissəsi)*

**city**[2] ['sıtı] *adj* şəhər; **~ court** magistrat *(bəzi şəhərlərdə şəhər idarəsi)*; **~ council** bələdiyyə şurası; **~ hall** *amer.* şəhər idarəsi, bələdiyyə; **~ government** şəhər muxtariyyəti; **~ manager** *amer.* şəhər bələdiyyə başçısı; **~ planning** şəhərin planlaşdırılması; **~ library** şəhər kitabxanası; **~ gas** məişətdə işlədilən qaz; **~ water** şəhərin su kəmərindən olan su; **~ entrances** şəhərə girişlər *(avtomagistral yollardan)*; **~ desk** *amer.* şəhər xəbərləri şöbəsi *(qəzetdə)*; **City man** kommersant, tacir, işbaz, bankir, kapitalist, bank sahibi;

◊ **Federal City** *amer.* ABŞ-ın mərkəzi *(Vaşinqton)*; **Eternal City** Əbədi şəhər *(Roma)*; **City of David** Davidlər şəhəri *(Qüds və ya Vifleem)*

**city-born** ['sıtıbɔ:n] *adj* şəhərdə doğulan / anadan olan

**city-bred** ['sıtıbred] *adj* şəhərli, şəhərdə böyümüş / boya-başa çatmış

**city-folk** ['sıtıfouk] *n top.i amer.* şəhərlilər, şəhər əhalisi, şəhərdə yaşayanlar

**cityscape** ['sıtıskeıp] *n* şəhər mənzərəsi

**city-wide** ['sıtıwaıd] *adj* ümumşəhər, bütün şəhər, şəhəri əhatə edən

**civic** ['sıvık] *adj* 1. vətəndaşlıq; mülki; **~ rights** vətəndaşlıq hüquqları; **~ duties** vətəndaşlıq borcu; **~ pride** vətəndaşlıq iftixarı; **~ oath** vətəndaşlıq andı; 2. şəhər; **~ event** şəhər hadisəsi; *The president's visit was the most important civic event of the year Prezidentin viziti şəhərdə ilin ən vacib hadisəsi oldu*

**civicism** ['sıvısızm] *n* vətəndaşlıq; öz hüquq və vəzifəsini dərk etmə /başa düşmə

**civic-minded** ['sıvık'maındıd] *adj* vətəndaşlıq hissi inkişaf etmiş

**civics** ['sıvıks] *n* 1. vətəndaşlığın əsasları, vətəndaşlıq hüququ; 2. mülki işlər

**civil** ['sıvıl] *adj* I 1. mülki; vətəndaş, vətəndaşlıq; **~ rights** mülki hüquqlar; **~ duties** vətəndaşlıq borcu; **~ war** vətəndaş müharibəsi; **~ disobedience** vətəndaş itaətsizliyi; **~ death** bütün vətəndaşlıq hüquqlarından məhrum edilmə; **~ manhood** vətəndaşlıq cəsarəti/mətanəti/qeyrəti; **~ servant** çinovnik, mülki dövlət işçisi; 2. mülki, qeyri-hərbi, sivil; **to enter ~ life** mülki həyata qayıtmaq, ordudan tərxis olunmaq; **~ defence** mülki müdafiə; 3. *hüq.* mülki; **~ case** mülki iş; **~ law** mülki qanun; **~ justice** mülki məhkəmə üsulu; **~ marriage** mülki izdivac/qeyri-dini kəbin

**civil** ['sıvıl] *adj* II 1. nəzakətli, ədəbli, mərifətli; **to keep a ~ tongue** dilini sakit qoymaq, kobudluq etməmək; *His answer was civil but not inviting Onun cavabı nəzakətli idi, lakin danışığı davam etdirmək üçün əsas vermirdi;* 2. mədəni, *arx.* təhsilli, təhsil görmüş, ziyalı

**civilian**[1] [sı'vıljən] *n* 1. mülki / qeyri-hərbi şəxs; 2. mülki əhali, mülki çinovnik

**civilian**[2] [sı'vıljən] *adj* mülki, sivil, qeyri-hərbi *(adam haq.)*; **~ occupation** mülki sənət/peşə; *I asked the soldier what his civilian occupation was Mən əsgərdən onun mülki peşəsinin nə olduğunu soruşdum;* **~ clothes** mülki paltar / geyim

**civility** [sı'vılıtı] *n* 1. nəzakətlilik, ədəblilik, mərifətlilik; **forms of ~** ədəblilik/nəzakətlilik formaları; 2. iltifat, lütfkarlıq, gülərüzlülük; **an exchange of civilities** qarşılıqlı iltifat/lütfkarlıq; 3. *arx.* tərbiyə, ədəb, nəzakət; təhsillilik, elmlilik, mədənilik

**civilization, -isation** [ˌsıvıl(a)ı'zeıʃn] *n* 1. mədəniyyət; mədənilik; **Greek ~** yunan mədəniyyəti; **ancient China ~** qədim Çin mədəniyyəti; 2. mədəni aləm / dünya

**civilizational** [ˌsıvıl(a)ı'zeıʃənəl] *adj* mədəniyyətə aid olan

**civilize, -ise** ['sıvılaız] *v* 1. mədəniləşdirmək, mədəni etmək; tərbiyələndirmək, tərbiyə vermək, davranmağı öyrətmək; 2. mədəniləşmək, mədəni olmaq

**civilized, -ised** ['sıvılaızd] *adj* 1. mədəni; 2. tərbiyəli, qanacaqlı



**civilizer, -iser** ['sıvılaızə^r] *n* mədəniləşdirici, mədəniyyət yayan / gətirən

**civilly** ['sıvılı] *adv* ədəblə, nəzakətlə

**clabber**[1] ['klæbə^r] *n* qatıq

**clabber**[2] ['klæbə^r] *v* tutmaq *(süd haq.)*, qatıq olmaq; turşumaq, çürümək

**clack**[1] [klæk] *n* 1. çatırtı, şaqqıltı; çatırtı-patırtı; cırıltı; 2. gurultu, səs-küy; cırıldama *(cırcırama haq.)*; 3. *məc.* laqqırtı, çərən-pərən; boş danışıq; 4. şaxşax, çaxçax, şaqqıldaq *(uşaq oyuncağı)*

**clack**[2] [klæk] *v* 1. tıqqıldatmaq, şaqqıldatmaq, çırtıldatmaq; **to ~ a whip** qamçını şaqqıldatmaq; *The teacher told the boy to stop clacking his pencil Müəllim oğlana dedi ki, karandaşı ilə taqqıldatmağı dayandırsın;* 2. ucadan çərənləmək/çərənçilik etmək, ucadan laqqırtı vurmaq/ boş-boş danışmaq, naqqallıq etmək; *Don't pay attention to clacking tongues Boş danışığa / laqqırtıya fikir vermə / verməyin*; 3. qaqqıldamaq *(toyuq)*

**clacker** ['klækə^r] *n* 1. şaxşax *(uşaq oyuncağı)*; 2. çərənçi, naqqal, boş-boş danışan, boşboğazlıq edən *(adam)*

**clad** [klæd] *adj* 1. geyinmiş, geyimli; *She was poorly clad O, pis /kasıb geyinmişdi; The old lady was clad in a fur coat Qoca xanım xəz palto geyinmişdi;* 2. çulğalanmış, bürünmüş; **to be ~ in mist** dumana/ çənə bürünmək; dumanla /çənlə çulğalanmaq; *The mountain was clad in mist Dağ dumana bürünmüşdü*; 3. qızıla / gümüşə tutulmuş; üzərinə zireh çəkilmiş, zirehli; **an armour ~ship** zirehli gəmi

**claim**[1] [kleım] *n* 1. tələb, tələb etmə; tələbnamə, iddia; iddia etmə; **territorial ~s** ərazi iddiaları/tələbi; **to set up a ~ to** *smth.*, **to lay ~ to** *smth.*, **to put in a ~ for** *smth.* bir şey haqqında iddia qaldırmaq/ iddia irəli sürmək; bir şeyi almaq iddiasında olmaq; *Does anyone make a claim to this purse? Bu pul kisəsi haqqında bir kəs iddia qaldırıbmı?*; **to acknowledge/to admit a ~** tələbi yerinə yetirmək/təmin etmək; **to make a ~ on** *smb.* **for** *smth.* bir şey üçün bir kəsin qarşısında tələb qoymaq; 2. ixtiyar; **moral ~** mənəvi ixtiyar; *What claim has he to the property? Onun bu əmlaka nə ixtiyarı çatır/var?*; **to raise a ~** tələb irəli sürmək; **to lay ~ to** *smth.* bir şeyə ixtiyarı olmağını demək; **to reject a ~** tələbi rədd etmək /qəbul etməmək; 3. *hüq.* dəyən ziyanı ödəmək üçün iddia qaldırma/tələb irəli sürmə; **to put in a ~** dəymiş ziyanı ödəmək üçün iddia qaldırmaq

**claim**[2] [kleım] *adj*: **~ check** sifarişi almaq üçün qəbz *(kimyəvi təmizləmə məntəqəsindən və s.)*

**claim**[3] [kleım] *v* 1. tələb etmək; **to ~ *one's* right** haqqını tələb etmək; özünə məxsus olanı tələb etmək; **to ~ attention** 1) diqqət tələb etmək; 2) diqqətə layiq olmaq; *Does anyone claim this pen? Bu qələmə sahib çıxan varmı?*; 2. iddiasında olmaq; tələb irəli sürmək; ixtiyarı olduğunu demək; **to ~ the throne** taxt-tac iddiasında olmaq; *I claim that the hearing should be postponed Mən tələb edirəm ki, işə baxılması təxirə salınsın*; **to ~ a fault** 1) *id.* səhv hesab etmək; 2) *hüq.* iddia qaldırmaq *(xüs. dəymiş ziyanı ödəmək məqsədilə)*; **to ~ damages** dəyən ziyanı ödəmək üçün iddia qaldırmaq; 3. *amer. d.d.* təsdiq / bəyan / hesab etmək; *I claim that it is false Mən bəyan / təsdiq edirəm ki, bu yalandır; He claimed to have reached the top of the mountain O bəyan etdi ki, dağın zirvəsinə/başına çatdı; She claimed to be the best tennis-player in the school O, bəyan etdi ki, məktəbdə ən yaxşı tennis oynayan odur*

**claimant** ['kleımənt] *n* iddiaçı, tələbkar, tələb / iddia edən

**claimer** ['kleımə^r] *n* = **claimant**

**clam**[1] [klæm] *n* I 1. yeməli dəniz molyusku *(onurğasız yumşaqbədənli dəniz heyvanı)*; **to go ~ming** molyusk yığmağa getmək; 2. *amer.* xəsis, simic *(adam)*

**clam** [klæm] *n* II zəngə vurulan zərbə

**clam**[2] [klæm] *v* (-mm-) I 1. molyusk yığmaq; 2. yapışmaq; yapışdırmaq; 3. *amer.* susmaq, səsini kəsmək; söhbəti kəsmək, danışmaqdan imtina etmək

**clam** [klæm] *v* II 1. çalmaq *(zəngi)*; 2. zəngə vurmaq *(zərbə)*; 2. səs-küyü kəsmək; susmağa məcbur etmək

**clamant** ['kleımənt] *adj* 1. yolverilməz, biabırçı, qanqaraldıcı, görünməmiş, eşidilməmiş *(çatışmazlıq, qüsur və s. haq.)*; **~ abuses** görünməmiş/eşidilməmiş sui-istifadə; yolverilməz xəyanət/cinayət; 2. çox zəruri/lazımlı/gərəkli *(ehtiyac haq.)*; 3. gurultulu, səs-küylü, çığırğan, qışqırıqçı; **~ for food** yemək üçün hay-küy/qışqırıq salan

**clambake** ['klæmbeık] *n amer.* 1. molyuskdan bişirilmiş yeməklər/xörəklər *(yemək)*; 2. dənizkənarı gəzinti / piknik

**clamber** ['klæmbə^r] *v* dırmaşmaq; **to ~ up the mountain** dağa dırmaşmaq

**clamberer** ['klæmbərə^r] *n* 1. alpinist, dağa dırmaşan *(adam)*; 2. sarılan/sarmaşan bitkilər

**clambering** ['klæmbərıŋ] *adj* dırmaşan; sarılan, sarmaşan; **~ plants** dırmaşan/sarmaşan bitkilər

**clamminess** ['klæmınıs] *n* 1. yapışqanlıq, yapışma qabiliyyəti, suvaşqanlıq; 2. nəmlik, rütubət, rütubətlilik

**clammy** ['klæmı] *adj* 1. yapışqan, suvaşqan; 2. nəm, rütubətli; **~ fogs** nəm/rütubətli duman /çən; 3. soyuq; **~ sweat** soyuq tər

**clamorous** ['klæmərəs] *adj* 1. səs-küylü, səsli-küylü; qışqırıqçı, hay-haray salan; 2. səsli, gursəsli; 3. inadlı, təkidli, əl çəkməyən, israrlı, sözünün üstündə duran; 4. təxirəsalınmaz, təc-

ili, yubadılmaz; ~ **debts** təxirəsalınmaz/yubadılmaz borclar

**clamour[1]** ['klæmər] *n* **1**. səs; səs-küy, qalmaqal; çığırtı, qışqırtı, qışqırıq, bağırtı; **the ~ of an angry crowd** acıqlı camaatın qışqırtısı/səs-küyü /bağırtısı; **2**. səs-küylü protest/etiraz/tələb; **~ against the bill** qanun layihəsi əleyhinə etiraz; **3**. xalq qəzəbi/hiddəti; **~ against colonial oppression** müstəmləkə zülmünə qarşı xalq narazılığı /hiddəti; **4**. arasıkəsilməz / sürəkli səs *(külək, dalğa və s. haq.)*; **5**. gurultu, səs-küy, hay-küy; **6**. gurultu, gumbultu, partıltı, şaqqıltı *(maşın və s. səsi)*; taqqıltı, tıqqıltı *(təkər və s. səsi)*

**clamour[2]** ['klæmər] *v* çığırmaq, qışqırmaq, bağırmaq; səs salmaq, səs-küy qaldırmaq / salmaq, qışqırıq salmaq; qızğın surətdə etiraz etmək, hiddətlənmək; **to ~ against the Cabinet** Kabinetin istefasını tələb etmək; **to ~ against colonialism** müstəmləkəçilik əleyhinə ayağa qalxmaq /qiyam qaldırmaq; *Men were eagerly clamouring to go home Adamlar qətiyyətlə tələb edirdilər ki, onları evə buraxsınlar; The baby is clamouring to be fed Uşaq qışqırıq salır ki, onu yedirtsinlər;* **to ~ down** susmağa məcbur etmək *(qışqırmaqla)*; **to ~ for** israrla/dönmədən/təkidlə tələb etmək; **to ~ for attention** diqqəti özünə cəlb etməyə çalışmaq; **to ~ out** uca səslə etiraz etmək, qışqıraraq/bağıraraq etiraz etmək

**clamoursome** ['klæməsəm] *adj dial.* səsli-küylü, gurultulu; gursəsli; hay-küylü, qışqırıqçı

**clamp[1]** [klæmp] *n* I **1**. *tex*. qısqac, sıxac; məngənə; **screw ~** vintli sıxac/məngənə; **2**. dəmir bənd, pərçim, çənbər

**clamp** [klæmp] *n* II **1**. yığın, topa, qalaq; **2**. sıra ilə yığılmış qalaq *(quru torf)*; **3**. torpağın altında saxlamaq üçün tərəvəz topası/qalağı *(xüs. kartof)*

**clamp** [klæmp] *n* III ağır yeriş; tappıltı *(ayaq səsi)*

**clamp[2]** [klæmp] *v* I topa yığmaq, topalamaq, qalaq vurmaq, qalaqlamaq

**clamp** [klæmp] *v* II *tex*. bəndləmək, bərkitmək, möhkəmlətmək, sıxmaq, sıxıb bərkitmək; *Clamp these 2 pieces of wood together Bu 2 parça taxtanı bir-birinə bərkit / bərkidin;*
◊ **to ~ down** ciddi olmaq, tələbkarlığı artırmaq *(bir kəsə qarşı)*

**clamp** [klæmp] *v* III ağır-ağır yeriмək; ayaq döymək, ayaqlarını yerə vurmaq

**clamper** ['klæmpər] *v* yamamaq, yamaqlamaq, yamaq salmaq / vurmaq, tələsik / atüstü yamamaq

**clan[1]** [klæn] *n* **1**. qəbilə; **2**. klan *(Şotlandiyada və İrlandiyada qəbilə icmalarının adı)*; **3**. qrup, kampaniya, dəstə, həmkarlar, məsləkdaşlar, güruh

**clan[2]** [klæn] *v* bir qrupda/dəstədə birləşmək, güruh yaratmaq, dəstə yaratmaq *(adam haq.)*

**clandestine** [klæn'destın] *adj* gizli; gizlin; üstüörtülü, məxfi; qeyri-leqal *(təşkilat və s. haq.)*; **~ meeting** gizli iclas; **~ marriage** gizli kəbin/izdivac

**clandestinely** [,klæn'destınlı] *adv* gizlincə, xəlvətcə, gizli surətdə / halda, üstüörtülü olaraq

**clandestineness** [klæn'destınıs] *n* = **clandestinity**

**clandestinity** [,klændes'tınıtı] *n* gizlilik, məxfilik, qeyri-leqallıq

**clang[1]** [klæŋ] *n* **1**. cingilti, cınqıltı *(metal səsi)*; **2**. qağıltı, qaqqıldama *(quş səsi)*, qaqqıldaşma *(durna haq.)*

**clang[2]** [klæŋ] *v* cingildətmək, cınqıldatmaq; taqqıldatmaq; cınqıldamaq, taqqıldamaq; *The metal tool clanged when it hit the stone Metal alət daşa dəyəndə cingildədi / cınqıldadı*

**clangour** ['klæŋgər] *n* cingilti, cingildəmə, dınqıltı, dınqıldama *(bir-birinə dəyən iki metaldan çıxan səs)*; *We could hear the clangour of the men's hammers even with the window closed Hətta pəncərələrin örtülü olmasına baxmayaraq biz kişilərin çəkiclərinin cingiltisini eşidə bilirdik*

**clangourous** ['klæŋgərəs] *adj* cingildəyən, cınqıldayan, dəmir səsi verən; qulaqbatırıcı *(maşın səsi və s. haq.)*

**clangourously** ['klæŋgərəslı] *adv* cingilti ilə; cingildəyə-cingildəyə, cınqıldaya-cınqıldaya

**clank[1]** [klæŋk] *n* cingilti, cingildəmə, cınqıltı *(metaldan çıxan səs)*, zınqıltı, zəng səsi

**clank[2]** [klæŋk] *v* **1**. cingildətmək, cınqıldatmaq; şaqqıldatmaq; **2**. cingildəmək, cınqıldamaq; şaqqıldamaq; *The prisoners ankle chains clanked as they walked Dustaqlar yeridikcə topuq zəncirləri cingildəyirdi*

**clannish** ['klænıʃ] *adj* **1**. klana/nəslə aid olan; qəbilə, ata-baba; **2**. öz nəslinə meylli; **3**. ailəbaz, dostbaz

**clanship** ['klænʃıp] *n* **1**. klana/nəslə aidlik, öz nəslinə / ailəsinə/klanına bağlılıq; **2**. qrupbazlıq, ailəbazlıq; məhdudluq, bağlılıq *(müəyyən qrupa və s.)*

**clansman** ['klænzmən] *n* (*pl* **-men** [-mən]) klanın / qəbilənin üzvü; **a ~ of mine** mənim qohumum / nəslimdən olan *(adam)*

**clap[1]** [klæp] *n* I **1**. əl çalma/vurma, alqışlama; **~ of hands** əl çalma / vurma, alqış; **2**. gurultu, göy gurultusu; **3**. *dial.* zərbə *(təle haq.)*; gözlənilməzlik; **4**. şapalaq; şappıldatma;
◊ **at a/ one ~** bir dəfəyə, bir zərbədə, bir zərbə ilə; **in a ~** gözlənilmədən, qəfildən, qəflətən, bir anda

**clap** [klæp] *n* II süzənək

**clap[2]** [klæp] *v* (**-pp-**) I **1**. əl çalmaq/vurmaq, alqışlamaq; *The audience clapped the actor Tamaşaçılar aktyoru alqışladılar;* **2**. çırpmaq, vurmaq *(qapını)*; **to ~ the door** qapını çırpmaq; **3**. vurmaq, şappıldatmaq, çalmaq *(qanad)*; **to ~ on the shoulder** çiyninə vurmaq/şappıldatmaq *(razılıq əlaməti olaraq)*; **4**. basmaq, salmaq *(həbsxanaya)*; **to ~ in prison** həbsxanaya basmaq/salmaq; **to ~ in** *arx.* atılmaq *(döyüşə və s.)*; **to ~ on 1)** mıxlamaq, çalmaq, mismarlamaq *(taxtanı və s.)*; **2)** yelkən qaldırmaq; **3)** vadar etmək, boynuna qoymaq; **to ~ up** sürəkli olaraq /arasıkəsilmədən alqışlamaq / əl çalmaq;
◊ **to ~ eyes on** *smb.* bir kəsi görmək; *I've never clapped eyes on him Mən heç vaxt onu görməmişəm, O heç vaxt mənim gözümə dəyməyib*

**clap** [klæp] *v* II süzənək olmaq

**clapper[1]** ['klæpər] *n* **1**. dil *(zəngdə)*; **2**. şaxşax *(quşu qovmaq üçün)*; *Many farmers use clappers to stop birds eating the crops Çox kəndlilər/fermerlər quşların məhsulu yeməsinin qarşısını almaq üçün şaxşaxdan istifadə edirlər*

**clapper[2]** ['klæpər] *v* **1**. zəng çalmaq *(kilsədə və s.)*; **2**. şaqqıldatmaq; şaqqıldamaq

**clapperclaw** ['klæpəklɔ:] *v arx.* **1**. cırmaqlamaq, cızmaq, caynaqlamaq, caynaqlayıb yırtmaq/ dağıtmaq; **2**. vurmaq, döymək; döyəcləmək; **3**. söymək, abrını almaq /tökmək, yamanlamaq; parçalamaq, tikə-tikə etmək, pərən-pərən salmaq

**claptrap** ['klæptræp] *n* **1**. mənasız/boş/ məzmunsuz ifadə; **2**. yüngül effekt

**claque** [klæk] *n fr.* **1**. klaka *(1) əl çalanlar, alqışlayanlar; 2) məddahlar, məddahlar dəstəsi)*

**clarification** [,klærıfı'keıʃn] *n* **1**. təmizləmə, təmizlənmə; saflaşdırma, saflaşdırılma; **2**. aydınlaşma, aydınlaşdırma; açılma

**clarifier** ['klærıfaıər] *n* **1**. şəffaflaşdırıcı; durulaşdırıcı *(maddə)*; **2**. *rad.* maneəni yox etmək üçün qurğu; **3**. südtəmizləyən *(cihaz)*

**clarify** ['klærıfaı] *v* **1**. təmizləmək; saflaşdırmaq; şəffaf etmək; süzmək, süzgəcdən keçirmək; **2**. təmizlənmək, şəffaflaşmaq; **3**. izah etmək, aydınlaşdırmaq; *Clarify your meaning Fikrini/Fikrinizi aydınlaşdır /aydınlaşdırın;* **4**. yoluna qoymaq, qaydasına salmaq, aydınlıq gətirmək *(münasibətlərə və s.)*; **to ~ disputes** mübahisəni qaydaya salmaq / həll etmək

**clarinet** [,klærı'net] *n* klarnet

**clarinettist** [,klærı'netıst] *n* klarnet çalan, klarnetçi

**clarion** ['klærıən] *n şair.* **1**. *mus.* sümsü; şeypur; **2**. sümsü / şeypur səsi; **3**. çağırış səsi, çağırış, müraciət, hay; **the cock's shrill ~** xoruzun qulaqbatırıcı səsi

**clarity** ['klærıtı] *n* **1**. təmizlik, saflıq; şəffaflıq; xalislik; **~ of a gem** almazın saflığı; **~ of water** suyun şəffaflığı; **2**. aydınlıq; **~ of thinking** fikrin aydınlığı

**clary** ['kleərı] *n bot.* sürvə, adaçayı

**clash[1]** [klæʃ] *n* **1**. cingilti, zınqıltı *(qılınc səsi)*; gumbultu, uğultu *(zəng səsi)*; **2**. dınqıltı, danqıltı *(qazan və s. səsi)*; **3**. qırma *(dolu haq.)*; **4**. toqquşma; vuruşma, çarpışma, döyüşmə, əlbəyaxa olma; **~es with the police** polislə toqquşma/əlbəyaxa olma; **5**. konflikt, toqquşma, ixtilaf, münaqişə; fikir ayrılığı; ziddiyyət; **~ of interest** maraqların toqquşması; **~ of opinions** baxışların ziddiyyəti; **6**. *dial.* qeybət, dedi-qodu, dalca danışma

**clash[2]** [klæʃ] *v* **1**. toqquşmaq *(bir-birilə)*, bir-birinə dəymək *(dəmir şeylər, xüs. dəmir silah)*; *Their swords clashed Onların qılıncları bir-birinə dəydi / toqquşdu; Their interests clash Onların marağı toqquşur; Your views clash with mine Biz müxtəlif nöqteyi-nəzərlərə malikik, Bizim fikirlərimiz müxtəlifdir; The enemy armies clashed near the border Düşmən orduları sərhəd yaxınlığında toqquşdular; One statement clashed with another Bəyanatın biri o birisinə zidd idi;* **2**. eyni vaxtda baş vermək, bir-birinə mane olmaq *(vaxt baxımından)*; *It's a pity the two football matches clash Heyf ki, iki futbol oyunu toqquşur (eyni vaxtdadır); Her wedding clashed with my examination so I couldn't go Onun toyu mənim imtahanımla toqquşdu, buna görə mən toya gedə bilmədim;* **3**. düz / uyğun gəlməmək, həmahəng olmamaq; *These colours clash Bu rənglər uyğun gəlmir / həmahəng deyil;* **4**. guppultu /şaqqıltı ilə vurmaq, döyəcləmək, döymək, cingildətmək, cınqıldatmaq, guruldamaq, gumbuldamaq; *Mother clashed two pans together to wake us up Anam bizi oyatmaq üçün iki qazanı bir-birinə vurdu;* **5**. **(into, against)** üstünə atılmaq / cummaq; hücum etmək /çəkmək; üstünə çıxmaq; *I clashed into him as I went round the corner Mən tini dönən kimi onun üstünə çıxdım;* **6**. *dial.* çırpmaq, vurmaq *(qapını və s.)*

**clasp[1]** [kla:sp] *n* **1**. dil *(toqqada)*; qarmaq *(boyunbağında)*; *The clasp on his belt had broken, so he had to hold his trousers up Onun toqqasının dili sınmışdı, ona görə o, şalvarını əli ilə tutmalı oldu;* **2**. bənd *(orden və ya medal lentində)*; **3**. sıxma; qucaq, ağuş; *He gave my hand a warm clasp O mənim əlimi hərarətlə sıxdı;* **4**. *tex.* sıxac, qısqac

**clasp[2]** [kla:sp] *v* **1**. düymələmək, bağlamaq; geyinmək; *He clasped the bracelet round the girl's wrist O, qızın biləyinə qolbağı bağladı;* **2**. sıxmaq; qısmaq; *The thief was clasping a knife Oğru bıçağı əlində sıxırdı;* **3**. qucaqlamaq; **to ~ in one's arms** qolları arasına/ağuşuna almaq; *The sisters were clasped in each other's arms Bacılar qucaqlaşmışdılar;* **to ~ smb.'s hand** bir kəsin əlini sıxmaq; *We met and clasped Biz rastlaşdıq və bir-birimizin əlini sıxdıq;*

**clasper** ['kla:spər] *n* **1**. düymə, çarpaz; bənd, qarmaq; **2**. *bot.* bığcıq *(bitki və həşəratlarda)*

**clasp-knife** ['kla:spnaıf] *n* qatlanan/bükülən bıçaq

**clasp-pin** ['kla:sppın] *n* 1. ingilis sancağı; 2. sancaq *(saça taxılan)*, saç sancağı
**class**[1] [kla:s] *n* I sinif *(ictimai)*; **the working ~** işçi/fəhlə sinfi; **the working ~es** zəhmətkeşlər *(sinif kimi)*; **the middle ~** cəmiyyətin orta təbəqəsi, burjuaziya sinfi; **the upper ~ 1)** aristokratlar, dvoryanlar, zadəganlar; **2)** cəmiyyətin yüksək təbəqəsi; iri burjuaziya; **lower middle ~ 1)** xırda burjuaziya; **2)** meşşanlar, meşşan təbəqə
**class** [kla:s] *n* II 1. sinif *(məktəbdə)*; qrup; dərəcə, kateqoriya; növ, cür, qəbil; **first ~** birinci dərəcə; **~es of weight** *id.* çəki dərəcələri; **ship's ~** gəmi növü; **two ~es of poets** iki qəbildən olan şairlər; **a good ~ of man** yaxşı adam; **a poor ~ of house** pis ev; **the best ~ of hotel** birinci dərəcəli mehmanxana; **to be no ~** *d.d.* heç nəyə yaramamaq / dəyməmək; **an inferior ~ of novels** aşağı keyfiyyətli romanlar; **in a ~ by itself** tayı olmayan, təkrarsız, əvəzsiz; 2. kurs; **to take ~es in** oxumaq, öyrənmək; *(peşə və s.)* **to take ~es in cookery** aşpazlıq kursunda oxumaq; 3. dərs; *What time does the class begin? Dərs nə vaxt başlanır?*; 4. tələbələrin və ya şagirdlərin buraxılışı *(bir ildə)*; **~ of 1970** yetmişinci il buraxılışı; 5. fərqlənmə; **to get /to obtain ~** kursu fərqlənmə ilə qurtarmaq; 6. *hərb.* bir ildə doğulan çağırışçılar; **the ~ of 1990** 1990-cı il çağırışçıları
**class**[2] [kla:s] *adj* sinifli, sinfi; **~ society** sinifli cəmiyyət; **~ struggle** sinfi mübarizə
**class**[3] [kla:s] *v* 1. təsnif etmək; çeşidləmək, sortlara /növlərə / dərəcələrə ayırmaq; 2. fərqləndirmək *(imtahan nəticəsində)*; *Smith got a degree but was not classed Smit diplom aldı, ancaq fərqlənmə diplomu yox*; 3. hesab etmək; *I class that as wickedness Mən onu qəddarlıq hesab edirəm*
**classable** ['kla:səbl] *adj* təsnif edilə /oluna bilən
**class-book** ['kla:sbuk] *n* sinif jurnalı
**class-conscious** ['kla:s'kɔnʃəs] *adj* sinfi şüur, sinfi şüuru olan; **~ worker** şüurlu / sinfi şüura malik olan fəhlə
**class-consciousness** ['kla:s'kɔnʃəsnıs] *n* sinfi şüur
**class-fellow** ['kla:s.felou] *n* sinif yoldaşı, həmsinif
**classic**[1] ['klæsık] *n* 1. klassik *(xüs. qədim dövr yazarları)*; 2. qədim filologiya mütəxəssisi; 3. klassik əsər; 4. klassisist, klassisizm tərəfdarı; 5. *pl* klassik dillər, klassik ədəbiyyat
**classic**[2] [klæsık] *adj* 1. klassik, antik; **~ authors** antik yazıçılar, yunan və Roma klassikləri; **~ lands** antik dünya ölkələri; 2.: **~ authors** klassik yazıçılar; **~ music** klassik musiqi; *Bach and Beethoven wrote classic music Bax və Bethoven klassik musiqi yazmışlar;* 3. nümunəvi; **~ case of smth.** bir şeyin nümunəvi halı; 4. tarixi; **~ battle ground** tarixi döyüş meydanı
**classical** ['klæsıkəl] *adj* klassik; **the ~ music of India** Hindistanın klassik musiqisi; **~ education** klassik təhsil; *He was given a classical education O, klassik təhsil almışdı*
**classicism** ['klæsısızm] *n* *ədəb.* klassisizm *(ədəbiyyatda və incəsənətdə antik nümunələri təqlid edən cərəyan)*; **the ~ of 16th century art** 16-cı əsr incəsənətində klassisizm
**classification** [.klæsıfı'keıʃn] *n* 1. təsnifat; təsnif etmə/edilmə, təsnif; **~ of parts of speech** nitq hissələrinin təsnifatı / təsnif edilməsi; 2. sortlara/növlərə / dərəcələrə ayırma, çeşidləmə *(bitkiləri, heyvanları və s.)*
**classified** ['klæsıfaıd] *adj* 1. klassifikasiya edilmiş, şöbələrə/qruplara/sortlara/növlərə ayrılmış; **~ arrangement** sistem halında yerləşdirilmiş *(kitab və s. haq.)*; **~ catalogue** sistemli kataloq; *If you look the classified part of the telephone book, you'll find plenty of hotels Əgər sən / siz telefon kitabının şöbələrə ayrılmış hissəsinə baxsan/baxsanız, orada çoxlu mehmanxana tapa bilərsən/bilərsiniz;* 2. *amer.* gizli, məxfi *(sənəd və s. haq.)*; *This information is classified; only president can see it Bu sənəd məxfidir; ona ancaq prezident baxa bilər*
**classifier** ['klæsıfaıər] *n* 1. təsnifçi, təsnif edən, təsnifat mütəxəssisi; klassifikator *(aparat)*; 2. çeşidləyici, malı növlərə / sortlara ayıran adam
**classify** ['klæsıfaı] *v* 1. təsnif etmək; **to ~ by date** xronologiyaya görə təsnif etmək; 2. növə görə təsnif etmək; növlərə ayırmaq, çeşidləmək; *People who work in libraries spend a lot of time classifying books Kitabxanada işləyən adamlar kitabların təsnifatına çox vaxt sərf edirlər;* 3. *amer.* məxfiləşdirmək, gizli/məxfi göndərmək *(sənəd və s. haq.)*; qrif qoymaq
**classless** ['kla:slıs] *adj* sinifsiz; **~ society** sinifsiz cəmiyyət
**class-list** ['kla:slıst] *n* 1. məktəblilərin *(şagirdlərin, tələbələrin)* siyahısı; 2. fərqlənmə diplomu alan tələbələrin / şagirdlərin siyahısı; 3. siyahı
**class-man** ['kla:smæn] *n* *(pl* **-men** [-mən]) fərqlənmə diplomu alan
**classmate** ['kla:smeıt] *n* bir sinifdə oxuyan, həmsinif, sinif yoldaşı; *He is my classmate O mənim sinif yoldaşımdır*
**classroom**[1] ['kla:sru:m] *n* sinif otağı, auditoriya
**classroom**[2] ['kla:sru:m] *adj* tədris; **~ discipline** tədris fənni; **~ film** tədris filmi
**classy** ['kla:sı] *adj jarq.* birinci növ/dərəcəli; ən yaxşı, əla, mükəmməl
**clatter**[1] ['klætər] *n* 1. tıqqıltı, taqqıltı; dınqıltı, cingilti, zınqıltı *(qabların bir-birinə və s. dəyməsi nəticəsində çıxan səs)*; **a ~ of metal plates** dəmir boşqabların dınqıltısı/cingiltisi; *The clatter came from the kitchen Cingilti/Dınqıltı səsi mətbəxdən gəldi;* 2. gurultu, partıltı, xarıltı, şaqqıltı; gumbultu; 3. tappıltı *(ayaq səsi)*; 4. cəfəngiyyat, boşboğazlıq, boş danışıq / söhbət



**clatter**[2] ['klætər] *v* 1. döymək, taqqıldatmaq, taqqıldamaq; tıqqıldatmaq, tıqqıldamaq; danqıldatmaq, danqıldamaq; *Dishes were clattering in the kitchen Qablar mətbəxdə danqıldayırdı; Don't clatter your knife on the plate Bıçağını /Bıçağınızı boşqaba döymə/döyməyin;* 2. gumbuldamaq; guruldamaq *(göy)*; 3. naqqallıq/boşboğazlıq etmək, çənə /laqqırtı vurmaq, çərənləmək, dil boğaza qoymamaq; **to ~ down** gumbultu ilə düşmək *(rəfdən və s.)*
**clause** [klɔ:z] *n* 1. maddə, bənd *(müqavilə, vəsiyyət və s.-də)*, qeyd, qeyd-şərt, klauzula *(müqavilədə ayrıca maddə, şərt və ya qeyd)*; **political and territorial ~s** siyasi və ərazi maddələri *(müqavilə və s.-də)*; **under ~ 5 of the agreement** müqavilənin 5-ci bəndinə müvafiq olaraq; 2. *qram.* cümlə; **principal/subordinate ~** baş / budaq cümlə
**clavicle** ['klævıkl] *n anat.* körpücük sümüyü
**clavier** ['klævıər] *n mus.* klaviatura; klavişlər, dillər *(pianoda, qarmonda və s.)*
**claw**[1] [klɔ:] *n* caynaq; dırnaq *(heyvanlarda)*; **~ of eagle** qartal caynağı; *A hen's claw has 3 toes Toyuğun caynağında 3 barmaq var;*
◊ **in smb.'s ~s** bir kəsin caynaqlarında; **to clip /to cut smb.'s ~s** bir kəsin qol-qanadını kəsmək / sındırmaq; **to get one's ~s into smb.** bir kəsə caynaq atmaq
**claw**[2] [klɔ:] *v* 1. cırmaqlamaq, caynaqlamaq, caynağı ilə cırıb dağıtmaq; *The cat clawed the door open Pişik cırmaqlayıb qapını açdı;* 2. tutmaq *(caynaqla)*; **to ~ hold of smth.** bir şeyi caynağı ilə tutmaq; 3. acgözlüklə qapmaq *(əllə)*; qamarlamaq *(pulu və s.)*;
◊ *Claw me and I'll claw thee ≅ Əl əli yuyar, əl də üzü;* **to ~ the back** *arx. dial.* yaltaqlanmaq, yarınmaq
**clawed** [klɔ:d] *adj* caynaqlı, caynağı olan
**clawless** ['klɔ:lıs] *adj* caynaqsız, caynağı olmayan
**clay**[1] [kleı] *n* 1. gil, gil torpaq; 2. lil, lehmə, palçıq, zığ
**clay**[2] [kleı] *v.* gillə suvamaq
**clay-brained** ['kleı'breınd] *adj* axmaq, gic, sarsaq, səfeh, başıboş, yelbeyin
**clay-cold** ['kleıkould] *adj* soyuq, cansız, ölü, ölgün
**clayey** ['kleıı] *adj* gilli; **~ soil** gilli torpaq, gil torpaq; **~ brick** çiy / bişməmiş kərpic
**clean**[1] [kli:n] *adj* 1. təmiz; **~ hands** təmiz əllər; **~ clothes** təmiz paltar; 2. səliqəli; **~ room** səliqəli otaq; **to keep oneself ~** özünü səliqəli saxlamaq; **to keep one's house ~** evini təmiz/səliqəli saxlamaq; 3. yaxşı, comərd, səxavətli; **to lead a ~ life** yaxşı həyat sürmək; 4. təzə, işlənməmiş, təmiz; **~ sheet of paper** təmiz *(yazılmamış)* vərəq; **~ linen** təmiz alt paltarı; 5. xalis, qarışığı olmayan; **~ gold** xalis qızıl; **~ diamond** xalis brilliant; 6. başdan-başa, ucdantutma, elliklə; **~ cutting** başdan-başa /ucdantutma kəsmə/qırma *(meşəni)*; 7. düz, hamar; **~ coast** hamar / düz sahil; 8. mütənasib, qədd-qamətli, tən-dürüst; qəşəng, yaraşıqlı *(əl, ayaq və s. haq.)*;
◊ **to keep a ~ tongue** nalayiq / ədəbsiz ifadələr işlətməmək; **the ~ thing** *amer.* düzlük, təmizlik, doğruluq; açıqlıq, düzlük, səmimilik; **to have ~ hands in a matter** günahsız olmaq, bir işdə əli olmamaq; **to make a ~ breast of smth.** bir şeyi tam etiraf etmək / boynuna almaq; **to show a ~ pair of heels** qaçıb aradan çıxmaq, əkilmək, daban almaq, götürülmək; *d.d.* dabanına tüpürmək
**clean**[2] [kli:n] *v* 1. təmizləmək; **to ~ teeth / nails / shoes** diş /dırnaq /ayaqqabı təmizləmək; 2. səliqəyə / qaydaya salmaq, silib süpürmək, yığışdırmaq; **to ~ a room** otağı qaydaya salmaq/silib süpürmək/yığışdırmaq; 3. silmək, yumaq, təmizləmək; **to ~ a window** pəncərəni silmək / təmizləmək/yumaq; **to ~ a floor** döşəməni silmək /təmizləmək; *I must have these clothes cleaned Mən bu paltarları yudurtmalıyam;* 4. saflaşdırmaq, yumaq *(qızılı)*; 5. cilalamaq *(metalı)*; 6. atmaq, daramaq *(kətanı)*; 7. ağırlığı sinəsinə almaq / qaldırmaq *(ağır atletika)*; **to ~ down 1)** təmizləmək, süpürüb yığmaq/atmaq *(zibili, tozu divardan və s.)*; **2)** təmizləmək, qaşovlamaq *(atı)*; **to ~ out 1)** təmizləmək; boşaltmaq; **2)** *d.d.* soymaq, var-yoxunu oğurlamaq; *They have cleaned me out Onlar məni soydular/var-yoxumu əlimdən aldılar;* **to ~ up 1)** götürmək/yığışdırmaq *(yerdən, döşəmədən və s.)*; **2)** özünü qaydaya/səliqəyə salmaq; 3. *d.d.* işləri qaydasına salmaq, yarımçıq qalmış işi qurtarmaq;
◊ **to ~ the slate** köhnə təəhhüddən qurtarmaq; **to ~ the problem out of head-lines** məsələyə baxmağı qeyri-müəyyən müddətə təxirə salmaq
**clean**[3] [kli:n] *adv* 1. tamam, tam, büsbütün, tamamilə; *I clean forgot about it Mən onu tamamilə / büsbütün unutmuşam; He is clean mad O tamamilə dəlidir;* 2. düz; *The bullet went clean through his shoulder Güllə düz onun çiynindən keçdi;* 3. *d.d.* tərtəmiz; büsbütün; **to scrub the floor ~** döşəməni tərtəmiz qaşıyıb təmizləmək; 4. boş; *The ship returned home clean: no fish had been caught Gəmi evə boş qayıtdı: heç bir dənə də balıq tutulmamışdı*
**clean-cut** ['kli:n'kʌt] *adj* 1. səliqəli, təmiz, yaraşıqlı; **a ~ young man** yaraşıqlı/səliqəli cavan oğlan; 2. aydın, dəqiq; **a ~ explanation** aydın, dəqiq izahat; **~ scheme** dəqiq plan
**cleaner** ['kli:nər] *n* 1. təmizləyən, təmizləyici *(adam)*; süpürgəçi; 2. kimyəvi təmizləmə məntəqəsinin sahibi, kimyəvi təmizləmə məntəqəsinin işçisi; 3. ovxalayıcı, sürtüb xırdalayıcı *(işçi)*; pəncərə silən; 4. *texn.* təmizləyici,

saflaşdırıcı *(cihaz, maddə)*; 5. ləkə və s. aparan / təmizləyən vasitə

**cleaner's** ['kli:nəz] *n d.d.* kimyəvi təmizləmə məntəqəsi

**clean-fingered** ['kli:n'fıŋgəd] *adj* düz, təmiz, doğru, vicdanlı, namuslu, səmimi; dəyanətli, sədaqətli

**clean-handed** ['kli:n'hændıd] *adj* düz, təmiz, əli təmiz; günahsız, suçsuz, təqsirsiz

**cleaning**[1] ['kli:nıŋ] *n* 1. təmizləmə, təmizlənmə; yığışdırma, yığışdırılma, qaydaya salma/salınma; **the ~ of the streets/of the yards/of the gardens, *etc.*** küçələrin/həyətlərin/bağların təmizlənməsi; 2. *k.t.* sortlara/növlərə/çeşidlərə ayırma *(toxumu və s.)*

**cleaning**[2] ['kli:nıŋ] *adj* təmizləyən, təmizləyici, saflaşdırıcı; **~ rod** sünbə *(tüfəngin lüləsini təmizləmək üçün alət)*

**clean-limbed** ['kli:n'lımd] *adj* boylu, qamətli, boylu-buxunlu, qədd-qamətli, biçimli *(əndam haq.)*

**cleanliness** ['klenlınıs] *n* təmizlik; səliqə, səliqəlilik, təmizkarlıq, düzlük

**cleanly**[1] ['klenlı] *adj* təmiz, təmizkar, səliqəli

**cleanly**[2] ['kli:nlı] *adv* təmiz, tərtəmiz, təmizcə; səliqəli, səliqə ilə; əxlaqlı, ismətli; **to live ~** əxlaqlı / ismətli yaşamaq

**cleanness** ['kli:nnıs] *n* təmizlik, saflıq; mükəmməllik; **~ of style** üslubun təmizliyi / mükəmməlliyi

**cleanout**[1] ['kli:n'aut] *n* lyük

**cleanout**[2] ['kli:n'aut] *v* 1. təmizləmək, qaydaya salmaq *(otağı, şkafı, sandığı və s.)*; 2. bir kəsin pulunu bütünlüklə əlindən almaq *(oğurlamaq və ya oyunda udmaq yolu ilə)*; *I got cleaned out playing cards Mən qumarda bütün pullarımı uduzdum;* 3. hər şeyi oğurlamaq; *The thieves cleaned out the store Oğrular mağazada nə vardısa hamısını oğurladılar*

**cleansable** ['klenzəbl] *adj* təmizlənə bilən, təmizlənən

**cleanse** [klenz] *v* 1. təmizləmək; dezinfeksiya etmək; **to ~ a wound** yaranı təmizləmək/dezinfeksiya etmək; *The doctor cleansed the wound before stitching it Tikməzdən əvvəl / öncə həkim yaranı təmizlədi;* 2. mədəni boşaltmaq/təmizləmək *(işlətmə dərmanı vasitəsilə)*; 3. islah etmək, çəkindirmək *(pis əməllərdən)*; *My God, cleans me of my wickedness Allahım, məni pis əməllərdən çəkindir*

**cleanser** ['klenzə<sup>r</sup>] *n* kimyəvi maye və ya toz *(paltar, qab-qacaq və s. yumaq üçün)*

**clear**[1] [klıə<sup>r</sup>] *adj* 1. aydın, işıqlı; **~ day** aydın gün; **~ sky** təmiz/aydınsəma *(buludsuz)*; 2. təmiz, şəffaf; **~ conscience** təmiz vicdan; **~ skin** təmiz dəri; **~ water of the lake** gölün təmiz/şəffaf suyu; **~ glass** 1) şəffaf /təmiz şüşə; 2) təmiz/şəffaf güzgü; 3. aydın, dəqiq; **~ sight** aydın görmə qabiliyyəti; **~ reflection in the water** suda aydın əksetmə; **~ view** aydın görünüş; 4. cingilti, təmiz *(səs haq.)*; **~ tone** aydın/cingiltili səs; **~ voices of the children** uşaqların cingilti səsi; 5. aydın başa düşülən, şübhə doğurmayan; **~ conclusion** aydın / dəqiq nəticə; **to make a ~ statement** aydın və dəqiq fikir söyləmək; **to have a ~ idea** aydın/dəqiq təsəvvürə malik olmaq; *It's clear to me Bu mənə aydındır; I'm not clear on the point Bu məsələ mənə aydın deyil;* 6. aydın, ağıllı, kəskin, iti *(ağıl, zəka haq.)*; **~ intellect** aydın/kəskin ağıl; **~ head** ağıllı baş; 7. açıq, boş, maneəsiz; **~ passage** açıq keçid; **~ line** *d.y.* açıq / boş xətt; 8. bütün, tam; **~ month** bütün / tam bir ay; 9. mütləq, bütün; *He obtained a clear majority O, mütləq çoxluq qazandı (səsvermədə);*

◊ **in ~** şifrlənməmiş, açıq şəkildə; **in the ~** şübhə doğurmayan, şübhəsiz; *All clear 1) Yol açıqdır; 2) hərb. Düşmən yoxdur /aşkar edilməyib; All clear signal Təhlükə bitdi! (siqnal);* **to see *one's* way ~** yolunu aydın görmək; **as ~ as day** gün kimi aydın

**clear**[2] [klıə<sup>r</sup>] *v* 1. təmizləmək; təmizlənmək; açılmaq; *After the storm the sky cleared Tufandan sonra səma açıldı/təmizləndi; This soap should help to clear your skin Bu sabun sənin / sizin dərinin / dərinizin təmizlənməsinə kömək edəcək;* 2. yığışdırmaq; **to ~ the table** stolu yığışdırmaq; 3. açılmaq; *The sky is clearing Səma açılır; The weather is clearing Hava açılır;* 4. izah etmək, aydınlaşdırmaq; **to ~ *one's* meaning** öz fikrini izah etmək/aydınlaşdırmaq; **to ~ *smb.* in regard to a matter** bir kəsə məsələni izah etmək; 5. azad etmək, maneəni aradan götürmək/qaldırmaq, təmizləmək; **to ~ the stones from the road** yolu daşlardan təmizləmək; **to ~ the snow from the walk** cığırı qardan təmizləmək; **to ~ a way** yol açmaq; **to ~ the ground** sahəni *(əkmək üçün)* təmizləmək; **to ~ the room of people** adamları otaqdan çıxarmaq; *Clear the way! Yoldán çəkil!/çəkilin! Yol ver! / verin!* **to ~ *one's* mind of doubts/suspicions** şübhələri/tərəddüdləri başından çıxarmaq; 6. maneələri aşmaq; **to ~ a hedge** hasarın üstündən aşmaq; **to ~ the hurdle** *id.* maneəni dəf etmək / aşmaq; **to ~ the bar/the height** *id.* yüksəkliyi götürmək; 7. *hərb.* köçürmək; **to ~ casualties** yaralıları köçürmək; 8. boşaltmaq; **to ~ a ship of her cargo** gəmini yükdən boşaltmaq; 9. borcu vermək / ödəmək; *This sum will clear all his debts Bu məbləğ onun bütün borclarını ödəyəcək;* 10. gömrük rəsmiyyətlərini yerinə yetirmək; 11. xalis/təmiz gəlir götürmək; *The firm cleared $ 30 000 Firma 30 000 dollar xalis / təmiz gəlir götürdü;* 12. satmaq, satıb qurtarmaq / sovmaq; **to ~ goods** malı satıb sovmaq/qurtarmaq; 13. *id.* qaytarmaq, geri qaytarmaq *(topu və s.)*; **to ~ a corner** künc zərbəsi vurmaq *(futbol oyununda)*; **to ~ the puck** şaybanı müdafiə zonasından vurub çıxartmaq *(hokkey oyununda)*; **to ~ away** 1) qab-qacağı stoldan yığışdırmaq; *Please clear away the tea-things Zəhmət olmasa, çay dəsgahını stoldan yığışdır/yığışdırın;* 2) dağılmaq *(duman, bulud və s. haq.)*; *Clouds have cleared Buludlar dağılıb;* 3) dağıtmaq, aradan götürmək *(şübhəni)*; **to ~ off** 1) yarımçıq qalmış işi bitirmək / qurtarmaq; 2) çıxıb getmək, uzaqlaşmaq; *I'm buzy; Clear off at once Mən məşğulam; Bu saat çıxıb get / gedin;* 3) açılmaq, aydınlaşmaq *(hava haq.)*; 4) azad olmaq, yaxa qurtarmaq *(həyəcandan, qayğıdan və s.)*; **to ~ out** 1) yuyub təmizləmək, təmizləmək *(çirkdən, zibildən)*; *Clear out the cupboard, please Zəhmət olmasa qab şkafını /dolabı təmizlə/təmizləyin;* 2) *d.d.* pulsuz qoymaq; 3) qəfildən / qəflətən/gözlənilmədən çıxıb getmək; *I must clear out at once Mən dərhal getməliyəm; Clear out of my way! Yolumdan çəkil / çəkilin, Mane olma / olmayın!* **to ~ up** 1) açılmaq *(hava haq.)*; 2) qaydaya / səliqəyə salmaq; yığışdırmaq; *Clear up this litter at once Bu tör-töküntünü dərhal yığışdır/yığışdırın;* 3) izah etmək, aydınlaşdırmaq, açmaq *(məsələni)*; **to ~ up a question** məsələni aydınlaşdırmaq/izah etmək; *The mystery hasn't been cleared up yet Bu sirr hələ də açılmayıb;* 4) dağıtmaq *(şübhəni və s.)*; *Our fears were cleared up Bizim bütün qorxumuz yox oldu;*

◊ **to ~ an examination paper** imtahan biletində olan bütün suallara cavab vermək; **to ~ the coast** yolu təmizləmək, maneəni aradan qaldırmaq; **to ~ *one's* throat** boğazını təmizləmək /arıtlamaq; **to ~ the decks for action** *dən.* döyüşə/mübarizəyə hazırlaşmaq; **to ~ the skirts of *smb.*** bir kəsin adındakı ləkəni silmək, bir kəsin yaxşı adını özünə qaytarmaq; **to ~ a score /scores** hesablaşmaq, haqq-hesab çürütmək

**clear**[3] [klıə<sup>r</sup>] *adv* 1. tamamilə, bütün, büsbütün; *I clear forgot about him Mən onu tamamilə unutmuşam;* 2. aydın, aydın bir tərzdə/surətdə; *Speak loud and clear Ucadan və aydın danış / danışın!*

**clearance** ['klıərəns] *n* 1. təmizləmə, saflaşdırma; təmizlənmə, saflaşma, saflaşdırılma; 2. əkin üçün meşənin qırılması; 3. satma, satılma; satıb/satılıb qurtarma; 4. gömrük rüsumundan /vergisindən azad olma; 5. gömrük şəhadətnaməsi; 6. *av.* uçuşa icazə; 6. *id.* qapıdan zərbə *(futbol oyununda)*

**clear-cole** ['klıəkoul] *n tik.* astarlama, astarlanma, astar vurma/vurulma; astar çəkmə *(rənglə)*

**clear-cut** ['klıə'kʌt] *adj* aydın, dəqiq, müəyyən; **~ path to a future** gələcəyə aydın/müəyyən yol; **~ policy** dəqiq siyasət; *I want everything quite clear-cut Mən istəyirəm ki, hər şey aydın olsun*

**clear-eyed** ['klıəraıd] *adv* 1. yaxşı görən, dəqiq görən; 2. uzaqgörən, ağıllı, fərasətli, gözüaçıq, açıqgözlü

**clear-headed** ['klıə'hedıd] *adj* kəskin ağlı olan, çox ağıllı, dərrakəli, zəkalı

**clearing** ['klıərıŋ] *n* 1. təmizləmə, saflaşdırma, təmizlənmə, saflaşma; 2. əkin üçün nəzərdə tutulan təmizlənmiş sahə; 3. tala, açıqlıq, açıq yer, çəmən *(meşədə)*; 4. ucuzlaşdırılmış qiymətə satış; 5. klirinq *(dövlətlər arasında banklar vasitəsilə nağd pulsuz haqq-hesab)*; 6. *tex.* ara, aralıq, deşik; 7. qüsurun aradan qaldırılması

**clearly** ['klıəlı] *adv* 1. parlaq; aydın; *The sun shone clearly Günəş parlaq işıq saçırdı;* **to speak ~** aydın danışmaq; *He spoke so clearly that I could hear every word O elə aydın danışdı ki, mən hər bir sözü eşidə bildim;* **to see ~** aydın görmək; **to understand ~** aydın başa düşmək; 2. şübhəsiz, qeyd-şərtsiz; *This version is clearly wrong Bu variant şübhəsiz düz deyil; It is clearly impossible to start in such bad weather Tamamilə aydındır ki, belə pis havada yola çıxmaq olmaz*

**clearness** ['klıənıs] *n* aydınlıq, parlaqlıq, təmizlik; **~ of voice/sound** səsin aydınlığı

**clear-sighted** ['klıə'saıtıd] *adj* ağıllı, fərasətli, bəsarətli, gözüaçıq, açıqgözlü; gələcəyi görmə qabiliyyəti olan

**clear-sightedly** [ˌklıə'saıtıdlı] *adv* ağıllı, ağılla, fərasətlə, bəsarətlə; gözüaçıqlıqla, açıqgözlə

**clear-sightedness** [ˌklıə'saıtıdnıs] *n* ağıllılıq, fərasətlilik, bəsarətlilik, gözüaçıqlıq, açıqgözlülük

**clear-starch** ['klıəsta:tʃ] *v* kraxmallamaq

**cleat** [kli:t] *n* 1. planka, reyka, tamasa *(ensiz hamar lövhə)*; 2. paz, çiv; 3. klemma, sıxac; 4. şpunt *(taxtaları və s. bir-birinə bitişdirmək üçün uzununa çıxıntı)*

**cleavable** ['klı:vəbl] *adj* asan doğranan / yarılan *(odun)*

**cleavage** ['kli:vıdʒ] *n* 1. yarma, yarılma, parçalama, parçalanma; 2. ayrılma, aralanma; fikir ayrılığı, ixtilaf, ziddiyyət; **a sharp ~ in society between rich and poor** cəmiyyətdə dövlətlilərlə kasıblar arasında kəskin ziddiyyət; **~ in regard to views** baxışlarda fikir ayrılığı; 3. *fiz.* parçalanma, hissələrə bölünmə / ayrılma

**cleave** [klı:v] *v (pt* **clove, cleft, cleaved, clave**; *pp* **cloven, cleft, cleaved, clove***)* 1. yarmaq, doğramaq; *The axe cleaved the piece of wood Balta odun parçasını yardı; The ground was cloven by frost Yer şaxtadan çat-çat olmuşdu;* 2. parçalamaq, təfriqə/ikitirəlik salmaq; **the section into which society is cleft** cəmiyyətin parçalandığı qruplar; 3. yarılmaq; *This wood cleaves easily Bu odun asan yarılır;* 4. sadiq qalmaq *(bir kəsə / şeyə)*; **to ~ to a principle** bir prinsipə sadiq qalmaq

**cleaver** ['kli:və<sup>r</sup>] *n* 1. kərənti; 2. çapacaq, iri qəssab bıçağı

**clef** [klef] *n mus.* açar *(not sətrinin başında olub, onların mənasını müəyyən edən işarə);* **bass ~** bas açarı; **treble ~** skripka açarı

**cleft**[1] [kleft] *n* 1. çat, çatlaq, yarıq, çatlamış yer; 2. çat *(dəridə);* 3. *dial.* dilim; fal *(portağalda və s.);* 4. *dial.* qıxmıq, yonqar, talaşa; 5. uçurum; **a sharp ~ in society between rich and poor** cəmiyyətdə dövlətlilərlə kasıblar arasında dərin uçurum; *The climber fell down a cleft in the rock Alpinist qayadan uçuruma yıxıldı/ düşdü*

**cleft**[2] [kleft] *adj* 1. yarılmış, doğranmış; parçalanmış; 2. ikiyə ayrılmış/bölünmüş; **~ lip** ikiyə bölünmüş dodaq, dovşandodaq; **~ palate** ikiyə bölünmüş damaq, qurdağızlı; *He has a cleft palate and speaks with difficulty Onun damağı ikiyə bölünüb və çətinliklə danışır;*
◊ **in a ~** çətin / çıxılmaz vəziyyətdə

**cleft**[3] [kleft] **to cleave** *felinin pt, pp forması*

**clemency** ['klemənsı] *n* 1. mərhəmət, şəfqət, rəhm; yumşaqlıq, iltifat, rəhmdillik, güzəştə getmə; 2. yumşaqlıq, mülayimlik *(iqlim haq.)*

**clement** ['klemənt] *adj* 1. mərhəmətli, şəfqətli, rəhmli, ürəyinazik, rəhmdil; 2. yumşaq, mülayim *(iqlim haq.)*

**clench**[1] [klentʃ] *n* 1. sıxma *(yumruğunu);* 2. basma *(dişlərini);* 3. əsaslı/inandırıcı sübut

**clench**[2] [klentʃ] *v* 1. sıxmaq, qısmaq; yummaq; *He clenched his hands into hard fists O, yumruqlarını bərk-bərk sıxdı;* 2. qəti qərar qəbul etmək; **to ~ a matter** məsələni qəti həll etmək; **to ~ a bargain** saziş bağlamaq, sövdələşmək; 3. möhkəmlətmək *(əsəbi)*

**clenched** [klentʃt] *adj* möhkəm sıxılmış, yumulmuş; **~ fists** sıxılmış yumruqlar

**clergy** ['klə:dʒı] *n (the ~) top.i* ruhanilər

**clergyman** ['klə:dʒımən] *n (pl* **-men** [-mən]) ruhani, keşiş;

**clergywoman** ['klə:dʒı,wumən] *n (pl* **-women** [-,wımın]) keşişin arvadı / qızı

**clerical**[1] ['klerıkəl] *n* 1. ruhani; 2. klerikal *(klerikalizm tərəfdarı; klerikal partiyasının üzvü)*

**clerical**[2] ['klerıkəl] *adj* 1. ruhi, mənəvi; **~ garment** *kils.* ibadət libası; 2. klerikal; 3. dəftərxana; **~ worker** dəftərxanaçı, dəftərxana işçisi

**clericalism** ['klerıkəlızm] *n* klerikalizm *(siyasi və mədəni həyatda dini təşkilatların hakimiyyətini möhkəmlətməyə çalışan siyasi cərəyan)*

**clericalist** ['klerıkəlıst] *n* klerikalizm tərəfdarı

**clerk**[1] [kla:k] *n* 1. dəftərxana /kontor işçisi; **bank ~** bank işçisi/qulluqçusu; **telegraph ~** teleqrafçı; 2. çinovnik, məmur, hökumət qulluqçusu; 3. *amer.* satıcı *(mağazada);* prikazçik *(tacir dükanında satıcı, mağaza xidmətçisi);* 4. kilsə xidmətçisi; 5. savadlı / təhsilli adam; 6. *hərb.* katib; 7. *id.* katib *(yarışda)*

**clerk**[2] [kla:k] *v d.d.* dəftərxanaçı işləmək; mirzəlik etmək

**clerkly** ['kla:klı] *adj* 1. yaxşı xətti olan, qəşəng yazan; **~ hand** yaxşı xətt; 2. ruhani; 3. *arx.* savadlı, oxumuş

**clerkship** ['kla:kʃıp] *n* 1. katiblik vəzifəsi; 2. *arx.* savad, savadlılıq

**clever** ['klevə'] *adj* 1. ağıllı, kamallı, zəkalı; **to be ~** ağıllı / kamallı olmaq; **a ~ child** ağıllı / kamallı uşaq; **a ~ student** ağıllı / zəkalı tələbə; *He is a clever child O, ağıllı uşaqdır;* 2. bacarıqlı, ağıllı, məharətli, mahir, qabil; **~ workman** bacarıqlı/qabiliyyətli işçi; **~ conjurer** məharətli / mahir fokusçu *(fokus göstərən estrada/sirk artisti);* 3. rahat; qəşəng; **~ boat** rahat /qəşəng qayıq

**cleverly** ['klevəlı] *adv* ağılla, fərasətlə, bacarıqla, məharətlə

**cleverness** ['klevənıs] *n* 1. ağıllılıq, istedadlılıq, istedad, zəka; 2. bacarıq, qabiliyyət, məharət

**click**[1] [klık] *n* 1. şaqqıldama, şaqqıltı, mırçıltı, mırçıldama; 2. *tex.* dilçə, tətik *(silahda);* matqab, burğu; siyirmə, rəzə

**click**[2] [klık] *v* 1. bağlamaq *(qapını),* cəftəsini vurmaq; **to ~ the door** qapının cəftəsini vurmaq / siyirməsini keçirmək; 2. şıqqıldatmaq; **to ~ one's tongue** dili ilə şıqqıldatmaq; **to ~ one's heels (together)** dabanlarını bir-birinə vurub şaqqıldatmaq; 3. qələbə qazanmaq; 4. *sl* biri-birindən xoşu gəlmək, yola getmək; *Your nephew and I did not click Mən sənin / sizin bacın / bacınız oğlu ilə yola getmədim*

**clicker** ['klıkə'] *n* 1. ayaqqabı üzü biçən çəkməçi; 2. *poliqr.* metranpaj *(nabordan səhifə bağlayan mürəttib)*

**client** ['klaıənt] *n* müştəri; daimi müştəri / sifarişçi

**clientage** ['klaıəntıdʒ] *n top.i* müştərilər; sifarişçilər

**cliff** [klıf] *n* 1. sıldırım, sıldırım qaya; 2. dərin uçurum

**cliffy** ['klıfı] *adj* qayalı, qayalıq, sıldırımlı qayalıq, sıldırım

**climatal** ['klaımətəl] *adj* iqlim; **~ influence** iqlimin təsiri

**climate**[1] ['klaımıt] *n* 1. iqlim, ab-hava; **mild / healthy / dry / humid / wet ~** yumşaq/sağlam / quru/nəm/yaş iqlim; **moderate ~** mülayim /mötədil iqlim/ab-hava; 2. atmosfer, mühit, şərait; fikir, rəy; **~ of opinion** ictimai rəy; **~ of confidence** etimad şəraiti; **international ~** beynəlxalq şərait

**climate**[2] ['klaımıt] *v amer.* 1. yeni iqlimə uyğunlaşdırmaq, yeni mühitə alışdırmaq; 2. yeni mühitə / şəraitə uyğunlaşmaq

**climatic** [klaı'mætık] *adj* iqlim; **~ conditions** iqlim şəraiti; **~ treatment** *tib.* klimatoterapiya *(iqlimlə müalicə üsulu)*

**climatography** [,klaımə'tɔgrəfı] *n* klimatoqrafiya

**climatology** [,klaımə'tɔlədʒı] *n* klimatologiya *(iqlimi öyrənən elm)*



**climax**[1] ['klaımæks] *n* yüksək / ən yüksək nöqtə; **the ~ of a dramatic action** dramatik hərəkətin ən yüksək nöqtəsi; **to arrive at the ~** yüksək nöqtəyə çatmaq

**climax**[2] ['klaımæks] *v* ən yüksək nöqtəyə çatmaq / çatdırmaq

**climb**[1] ['klaım] *n* 1. qalxma, dırmaşma, çıxma; **difficult ~** çətin dırmaşma/çıxma; 2. *av.* yuxarı qalxma;
◊ **to be on the ~** mənsəbə çatmaq

**climb**[2] [klaım] *v* 1. dırmaşmaq, qalxmaq; **to ~ a tree/mountain** ağaca/dağa dırmaşmaq; *The old lady climbs up the stairs with difficulty Qoca xanım pilləkənləri çətinliklə qalxır; Do you think you can climb that tree? Sən/Siz fikirləşirsən /fikirləşirsiniz ki, o ağaca dırmaşa bilərsən / bilərsiniz?* **to ~ on all fours** iməkləyərək dırmaşmaq; *The sun was climbing to the zenith Günəş günorta yerinə qalxırdı;* 2. sarılmaq, sarmaşmaq *(bitki haq.); The ivy is climbing up the wall Sarmaşıq divara sarmaşır;* 3. mənsəbə çatmaq, özünə yol açmaq; **to ~ the heights of power** hakimiyyətin yuxarı pilləsinə çatmaq; **to ~ to success** nailiyyət/müvəffəqiyyət qazanmaq; 4. *av.* yüksəkliyə qalxmaq; **to ~ down** 1) enmək, aşağı düşmək; **to ~ down a tree** ağacdan enmək/aşağı düşmək; 2) güzəşt etmək, güzəştə getmək, mövqeyi əldən vermək; *We stood firm over the question and at last they climbed down Biz məsələnin üstündə möhkəm dayandıq və nəhayət onlar güzəştə getdilər;*
◊ **to ~ up the ladder** müvəffəqiyyət qazanmaq, mənsəbə çatmaq

**climbable** ['klaıməbl] *adj* dırmaşıla bilən, dırmaşmaq/qalxmaq mümkün olan; *Is the tree climbable Bu ağaca dırmaşmaq mümkündürmü?*

**climb-down** ['klaım'daun] *n* 1. eniş; 2. güzəşt *(mübahisədə);* 3. həqarət, təhqir, təhqir etmə, hörmətdən salma

**climber** ['klaımə'] *n* 1. alpinist; 2. sarmaşan bitki; 3. mənsəbpərəst, şöhrətpərəst; 4. *pl* montyor caynağı *(şalbana dırmaşmaq / çıxmaq üçün);*
◊ *Hasty climbers have sudden falls at. söz.* ≅ *Tələsən təndirə düşər*

**climbing**[1] ['klaımıŋ] *n* qalxma, çıxma; içəri soxulma/girmə; *Are you fond of climbing mountain? Sən / Siz dağa çıxmağı sevirsənmi / sevirsinizmi?*

**climbing**[2] ['klaımıŋ] *adj:* **~ irons** 1) alpinistin ayaqqabılarındakı mismar; 2) montyor caynaqları *(şalbana dırmaşmaq üçün alət);* **~ speed** *av.* yüksəkliyə qalxma sürəti; **~ ability** yoxuşu qalxma qabiliyyəti

**clime** [klaım] *n* 1. *arx.* = **climate**[1] *(1-ci mənada);* 2. *şair.* ölkə; **to seek a milder ~** isti ölkələrə getmək

**clinch**[1] [klıntʃ] *n* 1. sıxma; sıxac; sancaq; 2. bir-birini tutma *(boks oyununda)*

**clinch**[2] [klıntʃ] *v* 1. əymək, qatlamaq, bükmək *(mismarı);* pərçimini açmaq *(boltun);* 2. tutmaq *(boks oyununda rəqibi);* 3. razılaşmaq, işləri yoluna qoymaq; **to ~ the case** məsələni həll etmək; **to ~ a bargain** razılığa gəlmək; 4. *d.d.* qucaqlamaq, ağuşuna almaq

**clincher** ['klıntʃə'] *n* 1. pərçimçi, pərçim ustası; 2. çənbər, dəmir bənd

**cling** [klıŋ] *v (pt; pp* **clung)** 1. yapışmaq; ilişmək; tutmaq; bərk-bərk yapışmaq; *Mud clings to the boots Palçıq ayaqqabıya yapışır; Wet clothes cling to the body Yaş paltar bədənə yapışır; The child clung to his mother's hand Uşaq anasının əlindən yapışdı/tutdu;* 2. sallanmaq; *Heavy clouds clung to the mountains Ağır buludlar dağların üstünə sallanmışdı;* 3. sadiq qalmaq /olmaq; 4. yapışmaq/oturmaq *(paltar haq.);*
◊ **to ~ like grim death** var qüvvəsi ilə yapışmaq

**clinging** ['klıŋıŋ] *adj* yapışan *(bədənə);* **~ dress** yapışan paltar

**clingstone** ['klıŋstoun] *n* çıxmayan çəyirdək *(şaftalıda və s.)*

**clingy** ['klıŋı] *adj* yapışan, yapışqan

**clinic** ['klınık] *n* 1. *tib.* klinika; müalicəxana; 2. şəxsi xəstəxana; 3. poliklinika *(xəstəxananın nəzdində);* 4. tibb institutu tələbələrinin klinikada praktik məşğələləri; 5. *arx.* yorğan-döşəyə düşmüş xəstə

**clinical** ['klınıkl] *adj* klinika, klinik; **~ record** xəstəliyin tarixi; xəstəliyin tarixini yazmaq üçün blank; **~ work** müalicə işi

**clink**[1] [klıŋk] *n* cingilti *(şüşənin, nazik metalın, açarların, dəmir pulun)*

**clink**[2] [klıŋk] *v* 1. cingildəmək; *Glasses / Keys/ Coins clink Şüşələr/Açarlar /Dəmir pullar cingildəyir;* 2. cingildətmək; **to ~ glasses** badələri cingildətmək, bir kəsin sağlığına badə qaldırmaq / içmək

**clink-clank** ['klıŋkklæŋk] *n* dınq-dınq, cınq-cınq *(səs təqlidi)*

**clinking** ['klıŋkıŋ] *adj* 1. cingildəyən, zınqıldayan; 2. *d.d.* birinci dərəcəli, əla

**clinquant**[1] ['klıŋkənt] *n* 1. güləbətin; 2. zahiri bərbəzək / bəzək

**clinquant**[2] ['klıŋkənt] *adj* parlayan, parıltı saçan / verən; qızıl-gümüşlə bəzədilmiş

**clip**[1] [klıp] *n* I 1. sıxac; sancaq, qısqac, dəftərxana sancağı; **paper ~** dəftərxana sancağı; *Fasten these sheets of paper together with a clip Bu kağız vərəqlərini dəftərxana sancağı ilə bir yerə bərkit/bərkidin;* 2. pərçim, dəmir bənd; 3. sıxmaq üçün kəlbətin; maşa; 4. broşka *(bəzək sancağı);* 5. patron darağı

**clip** [klıp] *n* II 1. saç fasonu; kəsmə *(dırnağı),* yun qırxma; 2. bir sürü qoyundan birdəfəyə qırxılan

yun; 3. cəld zərbə; *He hit the child a clip O, uşağa cəld zərbə vurdu*; 4. *d.d.* cəld yeriş; **to go at a good** ~ cəld addımlarla getmək; *He moved at a good clip O, cəld addımlarla getdi*

**clip**[2] [klıp] *v* (-pp-) I sıxmaq; bərkitmək *(dəftərxana sancağı ilə)*; **to ~ sheets of paper together** kağız vərəqlərini bir yerə bərkitmək; *Clip these sheets of paper together, please Zəhmət olmasa, bu kağız vərəqlərini bir yerə bərkit / bərkidin*

**clip** [klıp] *v* (-pp-) II 1. kəsmək *(qayçı və s. ilə)*; **to ~ an article / a picture from a newspaper** qəzetdən məqalə / şəkil kəsmək; *I'm going to clip this picture out of the paper Mən qəzetdən bu şəkli kəsib çıxarmaq istəyirəm*; 2. kəsmək; *I'll clip your ear if you don't behave Özünü / Özünüzü yaxşı aparmasan / aparmasanız qulağını / qulağınızı kəsəcəm; The bus driver clipped our tickets to show we'd used them Avtobus sürücüsü bizim biletlərimizi kəsdi ki, onların istifadə olunduğu bilinsin*; 2. qırxmaq, gödəltmək *(saç və s.)*; **to ~ sheep** qoyunu qırxmaq; 3. sözü və ya səsi buraxmaq / yemək *(işlətməmək)*; *He annoys me by clipping the ends of his words Sözlərin sonunu buraxmaqla/yeməklə o, məni əsəbiləşdirir*; 4. *dilç.* qısaltmaq *(sözü)*; 5. var gücü ilə qaçmaq; 6. *id.*: **to ~ one's stride** addımları qısaltmaq/gödəltmək; 7. *d.d. (bir kəsi)* yumruqla vurmaq, bir kəsə yumruq çəkmək; 8. *d.d.* aldatmaq, kələk gəlmək;

◊ **to ~ someone's wings** bir kəsin qol-qanadını sındırmaq / kəsmək

**clipped** [klıpt] *adj* 1. qırxılmış, kəsilmiş; **~ hair** qırxılmış saç; 2. gödəldilmiş; qısaldılmış; **~ word** qısaldılmış söz

**clipper** ['klıpəʳ] *n* I 1. bağ qayçısı; 2. baş qırxmaq üçün maşın; 3. heyvan qırxmaq üçün maşın, yaxud qayçı; 4. *tex.* itiağız kəlbətin

**clipper** ['klıpəʳ] *n* II 1. *dən.* kliper *(itigedən yelkənli gəmi)*; 2. itisürətli okean gəmisi; 3. sürətli transatlantik təyyarə

**clippie** ['klıpı] *n d.d.* qadın konduktor *(avtobusda, tramvayda)*

**clipping**[1] ['klıpıŋ] *n* 1. qəzetdən kəsilmiş parçalar; 2. qayçılama, qırxma, kəsmə; 3. yonqar, qırıntı; **nail ~s** dırnaq yonqarı / qırıntıları; 4. qırxım, yun qırxımı

**clipping**[2] ['klıpıŋ] *adj* 1. cəld hərəkət edən; 2. birinci dərəcəli, əla

**clique**[1] [kli:k] *n* dəstə, güruh, kampaniya *(quldur dəstəsi)*

**clique**[2] [kli:k] *v* dəstə / güruh yaratmaq

**cloak**[1] [klouk] *n* 1. plaş, yağmurluq, bürüncək; 2. bəhanə; maska; **under the ~ of charity** mərhəmət maskası altında; 3. örtük; pərdə; **~ of snow** qar örtüyü; **under the ~ of night** *şair.* gecənin pərdəsi altında

**cloak**[2] [klouk] *v* 1. bürüncəklə örtmək; 2. gizlətmək, örtmək, maskalamaq; *He cloaked his wicked purpose appearing to be friendly Özünü dost kimi göstərməklə o, öz məkrli məqsədini maskaladı/gizlətdi*

**cloak-room** ['kloukru:m] *n* 1. qarderob *(paltar saxlanılan yer)*; 2. *d.y.* saxlama kamerası; 3. tualet, ayaqyolu *(xüs. ictimai yerlərdə)*

**clobber**[1] ['klɔbəʳ] *n dd* 1. geyim, paltar; *I like your new clobber Mən sənin / sizin təzə paltarını/paltarınızı xoşlayıram*; 2. şey-şüy; bir kəsə məxsus şeylər; *I'll just get my clobber, then I'll be ready to go Mən bu saat şey-şüylərimi yığışdırım, sonra getməyə hazıram*

**clobber**[2] ['klɔbəʳ] *v jarq.* 1. döymək, əzişdirmək; *I'll clobber you if you don't do what you're told Sənə/Sizə deyilənləri etməsən / etməsəniz, səni / sizi əzişdirəcəm*; 2. tamamilə məğlub etmək, qırıb çatmaq; 3. *hərb.* havadan yerdəki hədəflərə hücum etmək; düşməni məğlub etmək

**clock**[1] [klɔk] *n* saat *(stolüstü, divar, qüllə)*; **hanging ~** asma saat; **talking ~** danışan saat; **the face of a ~** saatın siferblatı; *The clock is fast/slow Saat irəlidir / dala qalır; The clock gains/loses Saat qabağa qaçır / dala qalır*; **to wind up a ~** saatı qurmaq; **to put/to set the ~ on/back** saatı qabağa /dala çəkmək; **grandfather's ~** qədimi dik duran böyük saat;

◊ **~ watcher** tənbəl işçi *(saatı gözləyən)*; **like a ~** saat kimi dəqiq, düz; **like one o'clock 1)** çox cəld / sürətlə; *He ran down the street like one o'clock O, küçə aşağı çox cəld qaçdı*; 2) böyük həvəslə, canla-başla; *Will you come to the theatre tonight? - Like one o'clock Bu axşam teatra gələcəksənmi? -Canla-başla/Məmnuniyyətlə*; **to get on like one o'clock** özünü yaxşı hiss etmək; xoşbəxt olmaq/ yaşamaq, səfa sürmək; **to set/to turn back the ~** inkişafı dayandırmaq/dayandırmağa cəhd etmək, tarixin təkərini geri döndərməyə çalışmaq; **to sleep / to work the ~ round** 12 saat ara vermədən yatmaq / işləmək

**clock**[2] [klɔk] *v* 1. xronometraj vasitəsilə ölçmək *(vaxtı: müxtəlif yarışlar zamanı)*; *I clocked him while he ran a mile Onun bir mili necə müddətə qaçmasını mən xronometrajla ölçdüm*; 2. *id.* vaxt göstərmək; **to ~ the best time** ən yaxşı vaxt göstərmək; 3. işə gəlmə və işdən getmə vaxtını qeyd etmək; *The workman clocked in at 7 a.m. Fəhlə işə səhər saat 7-də gəldi*; 4. *jarq.* vurmaq, döymək; *I'll clock you if you annoy me Məni narahat etsən/etsəniz, səni/sizi döyəcəm*

**clockcase** ['klɔkkeıs] *n* saat qabı

**clocker** ['klɔkəʳ] *n dial.* qırt / kürt toyuq

**clock-face** ['klɔkfeıs] *n* siferblat *(saat və ölçü cihazlarında üzərində rəqəmlər olan lövhəcik)*

**clocking** ['klɔkıŋ] *n* vaxtı qeydə alma

**clocking-hen** ['klɔkıŋhen] *n* qırt/kürt toyuq

**clockmaker** ['klɔk͵meıkəʳ] *n* saatsaz, saatqayıran

**clockwise** ['klɔkwaız] *adv* saat əqrəbi istiqamətində



**clock-work** ['klɔkwə:k] *n* saat mexanizmi; *Everything went like clock-work Hər şey yağ kimi getdi*

**clod**[1] [klɔd] *n* 1. kəsək; qaya, qayma *(iri gil, daş, buz və s. parçası)*; **to break the ~s** kəsəyi/qayanı qırmaq; 2. laxta *(qan haq.)*; 3. səfeh/axmaq/gic adam; 4. boyun *(cəmdəkdə)*

**clod**[2] [klɔd] *v* 1. yapışmaq, yatmaq *(bir vəziyyətdə çox qalmaq nəticəsində)*; kəsəkli/nahamar olmaq; 2. laxtalanmaq *(qan haq.)*; 3. kəsək qımçırlamaq / atmaq

**cloddish** ['klɔdıʃ] *adj* 1. sarsaq, səfeh, axmaq, gic, ağılsız, başıboş, yelbeyin; 2. fleqmatik, soyuqqanlı, laqeyd, süst; qaraqabaq, üzügülməz; ləng, ağır; yöndəmsiz

**cloddy** ['klɔdı] *adj* kəsəkli, nahamar, dübür-dübür, kələ-kötür

**clod-hopper** ['klɔd͵hɔpəʳ] *n* 1. əkinçi, cütçü; 2. tənbəl, yöndəmsiz/ağırtərpənən adam, küt, key *(adam)*

**clod-pate** ['klɔdpeıt] *n* küt/korazehin/kütbeyin / axmaq / səfeh / sarsaq *(adam)*

**clog**[1] [klɔg] *n* 1. ağırlıq *(heyvanların hərəkətini məhdudlaşdırmaq və ya çətinləşdirmək üçün onların ayağından asılmış)*; 2. manеə, əngəl, çətinlik; **a perpetual ~ to public business** ümumi işə daima əngəl / manеə törədən; 3. zibilləmə, zibillənmə; tutulma *(boru və s. haq.)*; 4. altı taxtadan olan ayaqqabı

**clog**[2] [klɔg] *v* (-gg-) 1. mane olmaq, çətinlik/əngəl törətmək; **to ~ smb.'s movement** bir kəsin hərəkətinə mane olmaq /əngəl törətmək; 2. zibilləmək, çirkləndirmək; tutmaq *(kanalı, borunu və s.)*; bağlanmaq, tutulmaq; *The road was clogged with cars Maşınlar yolu bağlamışdı / tutmuşdu; His brain is clogged with useless facts Onun başı lazımsız faktlarla dolu idi; Don't clog your memory (up) with useless information Yaddaşını/Yaddaşınızı lazımsız məlumatlarla doldurma/doldurmayın*; 3. zibillənmək, tutulmaq, çirklənmək; 4. ayaqqabıya taxtadan altlıq vurmaq; 5. altlığı taxtadan olan ayaqqabıda oynamaq / rəqs etmək

**clog-dance** ['klɔg'da:ns] *n altlığı taxtadan olan ayaqqabı geyib oynanılan rəqs*

**clog-dancer** ['klɔg'da:nsəʳ] *n altlığı taxtadan olan ayaqqabı geyinib oynayan rəqqasə / rəqqas*

**clog-dancing** ['klɔg'da:nsıŋ] *n altlığı taxtadan olan ayaqqabı ilə oynama*

**cloggy** ['klɔgı] *adj* 1. kəsəkli, nahamar, dübür-dübür; 2. suvaşqan, yapışqan; qatı; 3. asanlıqla zibillənən / çirklənən

**cloister**[1] ['klɔıstəʳ] *n* 1. monastır; **to retire to a ~** monastıra getmək *(yaşamaq üçün)*; **to confine/to shut up smb. in a ~** bir kəsi monastıra salmaq/göndərmək; 2. (**the ~**) rahiblik həyatı; rahiblik

**cloister**[2] ['klɔıstəʳ] *v* 1. monastıra salmaq/göndərmək; 2. tənha bir yerə çəkilmək, adamlardan uzaqlaşmaq, uzaqlaşmaq *(cəmiyyətdən)*

**cloistered** ['klɔıstəd] *adj* 1. salınmış, sürgün edilmiş *(monastıra və s.)*; 2. tənha, yalqız, tək-tənha, cəmiyyətdən/adamlardan uzaqlaşmış

**cloistral** ['klɔıstrəl] *adj* 1. monastır, asket, zahid; **~ life** asket/zahid həyatı; 2. monastıra salınmış /göndərilmiş/sürgün edilmiş; 3. tək, tənha, təktənha, guşənişin

**close**[1] [klous] *n* I 1. divarla əhatələnmiş / ətrafına divar çəkilmiş yer *(evin və ya kəndin yaxınlığında)*; 2. oyun meydançası *(məktəbin yanında)*;

**close** [klous] *n* II 1. son, axır; qurtaracaq; nəticə; **at the ~ of the party** qonaqlığın sonunda / axırında; *At the close of the party there were few guests who weren't drunk Qonaqlığın sonunda demək olar ki, hamı keflənmişdi/sərxoş idi*; **at the ~ of one's days** ömrünün sonunda/axırında; *Day has reached its close Gün sona çatıb*; **to draw to a ~** sona/axıra yaxınlaşdırmaq; 2. bağlama, işin qurtarması; **at the ~ of the shop** mağaza bağlananda; 3. *mus.* ritm

**close**[2] [klous] *adj* I 1. bağlı, qapalı, örtülü; **~ carriage** bağlı / örtülü minik *(fayton, araba və s.)*; **~ vowel** *fon.* qapalı sait; **~ time/season** bağlı mövsüm *(ovçuluq üçün)*; **~ competition** qapalı yarış / müsabiqə; **~ election** qapalı/gizli seçki; **~ scholarship** müəyyən adamlara verilən təqaüd; 2. qapalı; tənha, yalqız, tək-tənha; **to keep oneself ~** tənha / yalqız yaşamaq; 3. gizli, gizlin; üstüörtülü, məxfi; **~ intent** gizli niyyət / məram / arzu; **to lie/to keep ~** gizlənmək; gözdən itmək; **to keep smth. ~** bir şeyi gizli saxlamaq, bir şeyi gizlətmək; 4. ciddi mühafizə edilən; **~ cell** xüsusi nəzarət altında olan/xüsusi mühafizə olunan kamera *(həbsxanada)*; **to keep in ~ confinement** ciddi rejimli həbsxanada saxlamaq

**close** [klous] *adj* II 1. yaxın; *Our house is close to the station Bizim evimiz vağzala yaxındır*; 2. çox yaxın; səmimi; *He is a close friend of mine O mənim çox yaxın / səmimi dostlarımdan biridir*; 3. sıx; **~ contact** sıx əlaqə; **~ alliance** sıx ittifaq; *There is a close resemblance between them Onlar bir-birinə çox oxşayırlar; Onlar arasında böyük oxşarlıq var*; 4. qalın *(parça və s. haq.)*; **~ texture** qalın parça; **~ thicket** qalın cəngəllik / meşə; 5. bədənə yapışan *(paltar haq.)*; 6. sıx, yığcam *(xətt)*; 7. boğucu, ağır, bürkü, boğanaq; bürkülü *(hava haq.)*; **~ air** boğucu/ağır hava; **~ day** bürkülü gün; **~ room** ağır havalı otaq; 8. əsaslı, ətraflı; **~ investigation** əsaslı/ətraflı tədqiqat; **~ analysis** ətraflı/əsaslı təhlil; 9. dəqiq, düz; **~ translation** dəqiq tərcümə; 10. xəsis, simic, dargöz; *He is close with his money O, xəsisdir / simicdir*; 11. *d.d.* çətin əldə edilən; *Money is close Pul çətin qazanılır*

**close**[3] [klouz] *v* I 1. örtmək, bağlamaq; yummaq; **to ~ a door / a window** qapını / pəncərəni ört-

mək; **to ~** *one's* **mouth** ağzını yummaq; **to ~ a gap** deşiyi bağlamaq /tutmaq; 2. *id.* fərqi azaltmaq; 3. örtülmək, bağlanmaq; *The door won't close Pəncərə / Qapı örtülmür; Some flowers close at night Bəzi çiçəklər gecələr yumulur; These shops close at six Bu mağazalar saat altıda bağlanır;* 4. *el.* qapamaq; **to ~ down 1)** bağlamaq, işini / fəaliyyətini dayandırmaq; qapanmaq; *Schools were closed down by the influenza epidemic Qrip epidemiyası ilə əlaqədar olaraq məktəblər bağlandı/qapandı;* **to ~ down a factory** fabriki bağlamaq; **2)** bağlanmaq, ləğv olunmaq /edilmək; *The theatre closes down Teatr ləğv olunur;* **3)** boğmaq, susdurmaq, represiyaya məruz qoymaq; **to ~ up 1)** bağlamaq *(zərfi);* **2)** örtülmək, bitişmək *(yara haq.);* **3)** kip bağlamaq; **4)** ağzına qıfıl vurmaq, qıfıllamaq, kilidləmək; *The house has been closed up for several years Bir neçə ildir ki, evin ağzına qıfıl vurulub;*

◊ **to ~ the door to/upon** *smth.* bir şeyi qeyri-mümkün etmək / çətinliyə salmaq, bir şeyin yolunu kəsmək; **to have** *one's* **eyes ~d** bir şeyə göz yummaq, bir şeyə barmaqarası baxmaq; **to ~** *one's* **parent's eyes** valideynin gözünü bağlamaq, valideynin ölümünün şahidi olmaq; **to ~** *smb.'s* **eye** bir kəsin gözünü vurub əzmək/ göyərtmək / zədələmək; **to ~** *one's* **ear to** qulaqardına vermək/vurmaq; **to ~** *one's* **mouth** dilini saxlamaq, sirr saxlamaq, danışmamaq, dinməmək, susmaq

**close** [klouz] *v* II 1. qurtarmaq, tamamlamaq, başa çatdırmaq; **to ~ a speech** nitqi / çıxışı qurtarmaq; 2. bağlamaq; **to ~ a meeting** iclası bağlamaq; **to ~ an account** *mal.* hesabı bağlamaq; 3. qurtarmaq, başa çatmaq/gəlmək; *His short life closed Onun qısa ömrü qurtardı / başa çatdı;* 4. razılaşmaq, razılığa gəlmək, müqavilə bağlamaq razılığına gəlmək; **to ~ in** gödəlmək, qısalmaq *(gün haq.); The days are closing in Günlər gödəlir / qısalır;*

◊ **to ~** *one's* **days** günlərini/ömrünü başa vurmaq, dünyasını dəyişmək, ölmək

**close** [klouz] *v* III yaxınlaşmaq, yaxına gəlmək; birləşmək; *We must close the ranks to secure peace Sülhü təmin etmək üçün biz birləşməliyik;* **to ~ in 1)** düşmək; bürümək, çulğalamaq; *Night closed in Gecə düşdü; Mist closed in upon us Duman bizi bürüdü / çulğaladı;* **2)** əhatə /mühasirə etmək; *The enemy now closed in upon us Düşmən bizi mühasirəyə aldı;* **to ~ up** yerinə keçmək; *Close up (komanda) Hər kəs öz yerinə!*

**close-bodied** ['klous'bɔdɪd] *adj* 1. dar, bədənə yapışan *(paltar haq.);* 2. xırdadənəvər, xırdadənəli

**close-cropped** ['klous'krɔpt] *adj* qısa qırxılmış, qısa kəsilmiş

**closed** [klouzd] *adj* 1. bağlı; bağlanmış; örtülü, örtülmüş, qapalı; **~ syllable** *fon.* qapalı heca; **~ fracture** *tib.* örtülü sınıq; **~ sea** daxili dəniz; **~ dislocation** *tib.* çıxıq; **~ work** yeraltı iş *(dağ altında görülən);* **~ account** bağlanmış hesab; 2. bağlı, üstüörtülü *(minik: fayton, araba və s. haq.);* **~ car** *d.y.* örtülü yük vaqonu;

◊ **with ~ doors** örtülü/bağlı qapılar arxasında; **~ shop** ancaq həmkarlar ittifaqının üzvlərini işə götürən müəssisə; **~ circuit** gizli / qapalı yayım *(dar məkana, məs. bir müəssisə və s. üçün verilən yayım)*

**close-down** ['klouz'daun] *n* işin dayanması/dayandırılması *(müəssisənin bağlanması ilə əlaqədar olaraq)*

**close-fisted** ['klous'fɪstɪd] *adj* xəsis, simic

**close-grained** ['klous'greɪnd] *adj* 1. xırdadənəli, xırdadənli, xırdadənəvər; 2. zərif lifli

**close-handed** ['klous'hændɪd] *adj* əlbəyaxa; **~ fight** əlbəyaxa vuruş / vuruşma

**close-harbour** ['klous'ha:bəʳ] *n* bağlı/qapalı liman

**close-in** ['klouz'ɪn] *n hərb.* əlbəyaxa vuruş / vuruşma, üz-üzə vuruş / vuruşma

**closely** ['klouslɪ] *adv* 1. yaxından; yaxın; *He resembles his father very closely O, atasına çox oxşayır;* 2. sıx; sıx-sıx, sıx surətdə; kip, möhkəm; **~ packed** kip qablaşdırılmış; **~ connected** möhkəm əlaqədə olaraq; **to work ~ with** *smb.* bir kəslə sıx əlaqədə işləmək; 3. diqqətlə; əsaslı tərzdə / surətdə; **to examine a case ~** işi diqqətlə nəzərdən keçirmək / öyrənmək; **to look ~ at** *smb.* bir kəsə diqqətlə baxmaq; **to question ~** ətraflı olaraq sorğu-sual etmək

**closeness** ['klousnɪs] *n* 1. bürkü, boğanaq, isti, ağırlıq, kəsiflik, boğunuqluq *(hava haq.);* **~ of atmosphere** havanın ağırlığı / boğunuqluğu; **~ of the room** otağın bürküsü /boğanağı; 2. sıxlıq, kiplik; qalınlıq; **~ of texture** parçanın kipliyi / qalınlığı; 3. xəsislik, simiclik, dargözlük

**close-stand** ['klous'stænd] *n* ayaqları birləşdirərək dayanma *(gimnastikada)*

**closet**[1] [klɔzɪt] *n* 1. *amer.* kiçicik anbar, anbarça; 2. *arx.* divar şkafı; 3. kabinet *(kabinet üçün mebel komplekti);* **bed ~** balaca yataq otağı; 4. tualet, ayaqyolu

**closet**[2] ['klɔzɪt] *adj* 1. gizli, gizlilik; gizlədilmiş, məxfi, üstüörtülü; **~ vows** gizli əhd-peyman /and içmə; 2. kabinet; həyatdan uzaq, qeyri-həyati; **~ politician** həyatdan uzaq/kabinet siyasətçisi, siyasətçi-nəzəriyyəçi

**closet**[3] [klɔzɪt] *v* bağlamaq, çəkilmək *(bir yerə);* **to be ~ed with** *smb.*, **to be ~ed together** bir kəslə təklikdə məsləhətləşmək; *The king and his ministers closeted themselves together while they talked about the government's difficulties Dövlətin çətinlikləri haqqında danışarkən kral və onun nazirləri qapalı bir yerə yığışdılar*

**close-tongued** ['klous'tʌŋd] *adj* təmkinli, səbirli, özünü saxlaya bilən, ehtiyatlı; dinməz, danışmaz, azdanışan, dilini sakit saxlayan



**closing**[1] ['klouzɪŋ] *n* 1. bağlanma, bağlama; *It's early closing today Bu gün mağazalar tez bağlanır / müəssisələr işi tez qurtarır;* 2. son, axır

**closing**[2] ['klouzɪŋ] *adj* son, yekun, axır; **~ speech** son söz, yekun sözü; **the ~ stages of the session** konfransın son mərhələsi; **~ stock inventory** son inventarizasiya, yekun inventarizasiyası; **~ date 1)** son tarix, axırıncı müddət *(sənəd və s. vermək üçün);* **2)** gəminin yük götürməsinin son / axırıncı günü

**closing switch** ['klouzɪŋ'swɪtʃ] *n el.* elektrik açarı, rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*

**closing-time** ['klouzɪŋtaɪm] *n* bağlanma vaxtı *(müəssisələrin, mağazaların və s.)*

**closure**[1] ['klouʒəʳ] *n* 1. bağlama, bağlanma, qurtarma, tamamlama, tamamlanma, başa çatdırma; dayanma; **a one-week ~ of schools** məktəblərdə dərslərin bir həftəlik dayandırılması; 2. müzakirənin / mübahisənin dayandırılması; **to move the ~** müzakirəni dayandırmağı təklif etmək; 3. *fon.* kipləşmə

**closure**[2] ['klouʒəʳ] *v* müzakirəni qurtarmaq / kəsmək *(parlamentdə və s.)*

**clot**[1] [klɔt] *n* 1. kəsək, kəltən; 2. qan laxtası, laxtalanmış qan; tromb *(qan damarında əmələ gələn qan laxtası);* 3. küt, korazehin, kütbeyin, gic *(adam)*

**clot**[2] [klɔt] *v* 1. laxtalanmaq; qatılaşmaq; ərp bağlamaq; 2. kəsək əmələ gətirmək, kəltənləşmək, kəltənə dönmək

**cloth** [klɔ:θ] *n* 1. *(pl* **cloths** [klɔθs, klɔðz, klɔ:θs]) parça *(yundan, pambıqdan və s. toxunmuş);* **American ~ 1)** müşəmbə; **2)** dermatin *(dəriyə oxşar parça);* **3)** süni dəri; 2. *(pl* **cloths** [klɔ:ðz]) **1)** bir parça əsgi; **2)** toz dəsmalı, toz almaq üçün dəsmal; *Pass the cloth, please; I want to clean the window Zəhmət olmasa, dəsmalı mənə ver/verin; pəncərəni silmək istəyirəm;* **3)** süfrə; **a table ~** stol süfrəsi; **to lay the ~** stola süfrə salmaq; 3. *top.i. arx.* geyim, libas;

◊ **gentlemen of the ~, the ~** ruhanilər; **to wear the black ~** ruhani adı qəbul etmək / almaq; **to have a ~ in the wind 1)** kefli / sərxoş olmaq; **2)** cındır paltar geymək, cır-cındır geymək; **a man of the ~** keşiş

**clothe** [klouð] *v* 1. geyindirmək, geydirmək; **to ~** *one's* **family** ailəni geydirmək, ailəni paltarla təmin etmək; 2. geymək, geyinmək; **to ~ oneself** geyinmək; *She clothed herself in her best O ən yaxşı paltarını geydi;* 3. örtmək, bürümək, çulğamaq; *Mist clothed the mountains Duman / Çən dağları bürüdü /çulğadı /örtdü; Spring clothed the earth with verdure Bahar yeri yaşıllığa bürümüşdü;* 4. qərq etmək; *The sun clothed the village with light Günəş kəndi işığa qərq etmişdi;* 5. *dan.* təchiz etmək

**clothes** [klouðz] *n pl* 1. geyim, libas; üst-baş; **Sunday ~** bayram paltarı / geyimi; **work-day ~** iş paltarı; **a suit of ~** kişi kostyumu; **plain ~** mülki paltar; **store ~** *amer.* hazır paltar; 2. yataq dəyişəyi *(döşəkağı, balışüzü və s.),* təmiz yataq dəyişəyi *(camaşırxanadan alınmış)*

**clothes-basket** ['klouðz.ba:skɪt] *n* paltar səbəti

**clothes-brush** ['klouðzbrʌʃ] *n* paltar şotkası

**clothes-line** ['klouðzlaɪn] *n* paltar asmaq və qurutmaq üçün kəndir, paltar kəndiri, zivə

**clothes-moth** ['klouðzmɔθ] *n* paltar güvəsi

**clothes-peg** ['klouðzpeg] *n* sancaq, sıxac *(yuyulmuş paltarı zivədən asarkən onu saxlamaq üçün)*

**clothes-pin** ['klouðzpɪn] *n amer.* = **clothes-peg**

**clothes-pole** ['klouðzpoul] *n* = **clothes-prop**

**clothes-press** ['klouðzpres] *n* paltar şkafı, paltar üçün komod *(siyirməli paltar şkafı)*

**clothes-prop** ['klouðzprɔp] *n* zivənin altına qoyulan dayaq

**clothier** ['klouðɪəʳ] *n* 1. *arx.* möhtəkir *(baha qiymətə satmaq üçün mal alıb yığan adam);* 2. parça və kişi paltarı alıb-satan alverçi; 3. dərzi; 4. mahudbasan *(usta)*

**clothing** ['klouðɪŋ] *n* 1. paltar, geyim, üst-baş; **articles of ~** paltar şeyləri; **ready-made ~** hazır paltar; 2. hərbi geyim/paltar; 3. geymə, geyinmə, geydirmə

**clothing-store** ['klouðɪŋstɔ:] *n amer.* parça mağazası

**cloth-line** ['klɔ:θlaɪn] *n d.d.* radio antennası

**cloth-maker** ['klɔ:θ.meɪkə] *n* mahud ustası, mahudçu

**clotted** ['klɔtɪd] *adj* 1. kəsəkli, nahamar, kəltənli; dübür-dübür; 2. qatılaşdırılmış, qatılmış, laxtalanmış; **~ blood** laxtalanmış qan; **~ cream** qaynadılmış qatı qaymaq;

◊ **~ nonsense** tam cəfəngiyat

**clotty** ['klɔtɪ] *adj* 1. qatılaşdırılmış, qatılaşmış; 2. kəsəkli, kəltənli, dübür-dübür

**cloud**[1] [klaud] *n* 1. bulud, qara bulud; *There wasn't a cloud in the sky Göydə / Səmada bir dənə də bulud yox idi; There's more cloud today than yesterday Bu gün dünənkinə nisbətən daha çox bulud var;* 2. burum, sütun, bulud *(tüstü haq.);* **~ of dust/steam** toz/buxar burumu /sütunu; 3. bir yığın, minlərcə; çoxlu, külli miqdar; **~ of mosquitoes/arrows** külli miqdar ağcaqanad/ox; **~ of flies** saysız-hesabsız milçək; 4. örtük, örtü; pərdə; **under ~ of night** gecənin qaranlığından istifadə edərək..; 5. kölgə / şübhə salan bir şey; **~ of war** müharibə təhlükəsi; **~ of suspicion** şübhə kölgəsi; 6. *pl* səma, göy; **to sail up into the ~s** göylərə qalxmaq; 7. boş toxunmuş qadın şərfi;

◊ **~ buster 1)** göydələn, çox uca / çoxmərtəbəli ev; **2)** sürətli təyyarə; **to blow a ~** papiros çəkmək; **to have** *one's* **head in the ~s, to be in the ~s** göylərdə uçmaq *(dünyadan xəbərsiz olmaq, xəyala qapılmaq);* **to drop from the ~s** göydən düşmək, gözlənilmədən baş vermək; **to be lost in the ~s** dəlillər / sübutlar içərisində çaşıb qalmaq;

**to lose oneself in the ~s** çaşıb qalmaq; **to be under a ~ 1)** şübhə altında olmaq; 2) çətin /çıxılmaz vəziyyətdə olmaq; *Every cloud has a / its silver lining ≅ Hər bir yamanda bir yaxşılıq var, Yaxşısız yaman olmaz*

**cloud[2]** [klaud] *v* 1. buludla örtmək/örtülmək, çulğalamaq; *The moon is clouded Ay buludla örtülüb; The sky clouded over Göy/Səma buludla örtüldü, Göyü bulud örtdü; The thick mist clouded the mountain tops Qalın çən dağların başını çulğadı/örtdü;* 2. kədərləndirmək, qəmləndirmək, əhvalını pozmaq/korlamaq, qanını qaraltmaq/ korlamaq; **to ~ the happiness** xoşbəxtliyi korlamaq; 3. əhvalı pozulmaq, qanı qaralmaq, pərt olmaq; 4. ləkələmək *(adını, şərəfini);* qara yaxmaq; 5. dumanlanmaq, dumanlandırmaq; bulandırmaq; *Her eyes clouded over Onun gözü dumanlandı;Age clouded his memory Yaş onun yaddaşını dumanlandırdı; The steam has clouded the windows up Buxar pəncərələri dumanlandırıb; You'll cloud the beer if you shake the barrel Çəlləyi tərpətsən /tərpətsəniz pivəni bulandıracaqsan / bulandıracaqsınız*

**cloudberry** ['klaud.berı] *n bot.* sarı böyürtkən

**cloud-burst** ['klaudbə:st] *n* leysan *(güclü / şiddətli yağış)*

**cloud-capped** ['klaudkæpt] *adj* buluda bürünmüş, buludla çulğalanmış *(dağın başı haq.)*

**cloud-capt** ['klaudkæpt] *adj* = **cloud-capped**

**clouded** ['klaudıd] *adj* donuq, tutqun; **~ glass** donuq / tutqun şüşə

**cloudiness** ['klaudınıs] *n* 1. buludluluq, buludluq; 2. dumanlanma, tutqunlaşma; düşkünlük; **~ of understanding** idrakın / ağlın dumanlanması

**cloudless** ['klaudlıs] *adj* buludsuz, aydın; **~ sky** buludsuz / aydın səma

**cloudy** ['klaudı] *adj* 1. buludlu, buludla örtülmüş; **~ sky** buludlu səma / göy; 2. dumanlanmış, dumanlı; aydın / aşkar olmayan; örtülü; **eyes ~ with sleep** yuxulu gözlər; **~ knowledge** dumanlı məlumat / bilik; **~ idea** dumanlı təsəvvür; 3. tutqun; qaşqabaqlı; qəmgin, kədərli, dərdli; **~ forehead** tutqun alın; 4. bulanıq, qeyri-şəffaf; **~ liquid** bulanıq maye; 5. damarlı, ləkəli, düyünlü *(mərmər, ağac, daş haq.)*

**clough** [klʌf] *n* dərin dərə; dar dərə/keçid; dərə, çuxur

**clout[1]** [klaut] *n* 1. *arx. dial.* parça, tikə; cındır; yamaq, pinə; **filthy ~** çirkli/kirli cındır; 2. *pl dial.* qundaq, bələk, əsgi *(uşağı bələmək üçün);* 3. bərk zərbə *(adətən əllə vurulan);* 4. *arx.* nişan *(ox atmaq üçün);* hədəfə dəymə *(oxla)*

**clout[2]** [klaut] *v* 1. *arx. dial.* yöndəmsiz / kobud şəkildə yamamaq /yamaq salmaq; 2. bərk / güclü şəkildə vurmaq *(əllə və ya yumruqla);* sillə / şapalaq vurmaq

**clouted** ['klautıd] *adj* I yamanmış, gözənmiş, yamaq qoyulmuş / salınmış

**clouted** ['klautıd] *adj* II qatılaşmış, qəlizləşmiş, qəlizləşdirilmiş, qatı, qəliz; laxtalanmış, laxtalandırılmış; laxta

**clouted-cream** ['klautıd'kri:m] *n* qaynadılmış qatı qaymaq

**clout-nail** ['klautneıl] *n* yastıbaşlı mismar / mıxça

**clove[1]** [klouv] *n* I 1. diş *(sarımsaqda);* 2. *bot.* soğanaq

**clove** [klouv] *n* II mixək; **oil of ~s** mixək yağı

**clove** [klouv] *n* III *tar.* çəki ölçüsü *(7-10 funt miqdarında)*

**clove[2]** [klouv] *v* mixək qatmaq / vurmaq

**clove[3]** [klouv] **to cleave** *felinin pt, pp forması*

**clove-carnation** ['klouvka:'neıʃn] *n* = **clove-pink**

**cloven[1]** ['klouvn] *adj* 1. yapılmış; parçalanmış; haçalanmış; ayrılmış, aralanmış, ikilənmiş; **~ hoof/foot** haçalanmış/ikiyə ayrılmış ayaq/dırnaq *(məməli heyvanlarda);* 2. pis / yaman məram; şeytanxarakterli; şeytan, fitnə-fəsadlı; **to show/to betray / to display the ~ foot/hoof** özünün məkrli xarakterini / xasiyyətini göstərmək

**cloven[2]** ['klouvn] **to cleave** *felinin pp forması*

**cloven-footed** ['klouvn'futıd] *adj* 1. qoşadırnaqlı, cütdırnaqlı *(heyvan haq.);* 2. şeytan, iblisanə, məkrli, kinli, qeyzli

**cloven-hoofed** ['klouvn'hu:ft] *adj* = **cloven-footed**

**clove-pink** ['klouvpıŋk] *n bot.* bağ qərənfili

**clover** ['klouvə'] *n bot.* yonca;
◊ **to be / to live in ~** dəbdəbə/cah-calal içərisində yaşamaq

**clover** ['klouvə'] *v* yonca səpmək

**clover-leaf** ['klouvəli:f] *adj* 1. yonca yarpağı; 2. yonca yarpağı şəklində, yonca yarpağına bənzər

**clove-tree** ['klouvtri:] *n bot.* mixək ağacı

**clow** [klau] *n* şlüz qapısı

**clown[1]** [klaun] *n* 1. kloun; 2. təlxək; 3. yonulmamış/törpüdəyməmiş cavan oğlan; kəndli-kütlü; avam, kobud adam

**clown[2]** [klaun] *v* 1. təlxəklik etmək; 2. axmaq-axmaq / səy-səy hərəkət etmək

**clownish** ['klaunıʃ] *adj* kloun, təlxək, təlxək kimi; **~ dress** kloun/təlxək paltarı; **~ behaviour** kloun / təlxək hərəkəti

**clownishness** ['klaunıʃnıs] *n* klounluq, təlxəklik, oyunbazlıq, nədimlik

**cloy** [klɔı] *v* doydurmaq; çiyrindirmək, ürəyini vurmaq; *Chocolates start to cloy if you eat too many Şokoladı həddən artıq yeyəndə adam çiyrinir/adamın ürəyini vurur*

**club[1]** [klʌb] *n* I 1. dəyənək, kötək; 2. *id.* hokkey ağacı; 3. qundaq *(tüfəngdə)*

**club** [klʌb] *n* II 1. klub, klub binası; *He started for the club in the afternoon Günortadan sonra o, kluba getdi;* **tennis ~** tennis klubu

**club** [klʌb] *n* III *pl* xaç, xaç xallı qumar kağızları; **to play a ~** xaç xallı kağızla başlamaq *(qumar oyununu)*

**club[2]** [klʌb] *v* **(-bb-)** I dəyənəklə / kötəklə / qundaqla döymək; **to ~ to death** dəyənəklə / kötəklə / qundaqla ölüncə döymək



**club** [klʌb] *v* **(-bb-)** II *(adət.* **to ~ together***)* 1. bir yerə yığılmaq/toplanmaq; birləşmək; *We clubbed together to buy them a new television Biz onlara yeni televiziya almaq üçün bir yerə yığışdıq (yəni pul topladıq);* 2. şəriklik / ortaqlıq yaratmaq

**clubbable** ['klʌbəbl] *adj d.d.* 1. kluba üzv ola bilən /olmağa layiq olan; 2. adamayovuşan, ünsiyyətli, mehriban, xoşsifət, kampaniya sevən

**club bag** ['klʌbbæg] *n* yol sumkası

**clubfoot** [.klʌb'fut] *n* əyriqıç *(anadangəlmə)*

**clubfooted** ['klʌb'futıd] *adj* əyriayaq, ayağı əyri, əyripəncə

**club-house** ['klʌb'haus] *n* klub binası

**club-law** ['klʌb'lɔ:] *n* I zorakılıq, yumruq qanunu, qolugüclülük hüququ

**club-law** ['klʌb'lɔ:] *n* II klubun nizamnaməsi

**club-man** ['klʌbmən] *n (pl* **-men** [-mən]) 1. klub üzvü; 2. *amer.* kübar/aristokrat adam

**clubwoman** ['klʌb.wumən] *n (pl* **-women** [-.wımın]) klub üzvü və ya həmişə kluba gedən qadın

**cluck[1]** [klʌk] *n* qaqqıldama *(toyuq haq.)*

**cluck[2]** [klʌk] *v* 1. qaqqıldamaq *(toyuq və s.);* 2. deyinmək, şikayət etmək, donquldanmaq, şikayətlənmək; *She clucked her disapproval O donquldanaraq narazılığını bildirdi*

**clue[1]** [klu:] *n* 1. çətinlikdən çıxmaq üçün açar, yolgöstərən xətt; **~ to a puzzle** tapmacanı açmaq üçün açar; 2. sübut, dəlil; 3. *amer.* məlumat, xəbər, informasiya

**clue[2]** [klu:] *v amer.* 1. xəbər vermək *(bir kəsə bir şey haqqında);* 2. aşkar etmək *(yeni faktları və s.);* 3. sirri açmaq/faş etmək

**clump[1]** [klʌmp] *n* 1. qaya, qayma *(iri daş, buz və s. parçası),* kəsək; 2. kötük; burma; 3. kol; **~ of lilacs** yasəmən kolu; 4. ağır addım səsi; 5. iki qat altlıq *(ayaqqabıda)*

**clump[2]** [klʌmp] *v* 1. bir qrupa yığmaq; 2. qrup halında əkmək; 3. ağır-ağır və yöndəmsiz yerimək; 4. ikiqat ayaqaltı salmaq / vurmaq *(ayaqqabıya)*

**clumse** [klʌms] *adj dial.* 1. soyuqdan keyləşmiş; 2. gic, axmaq, səfeh, başıboş; 3. tənbəl; yöndəmsiz; 4. qaşqabaqlı, qaraqabaq, üzügülməz, tutqun

**clumsily** ['klʌmzılı] *adv* yöndəmsiz, biçimsiz, yaraşıqsız bir tərzdə/surətdə; ədəbsizcəsinə, ədəbsiz bir tərzdə

**clumsiness** ['klʌmzınıs] *n* 1. ağırlıq, ləngllik; yöndəmsizlik, biçimsizlik, yaraşıqsızlıq; ağır tərpənmə, yavaştərpənmə; 2. kobudluq, qabalıq, ədəbsizlik; 3. yersiz hərəkət

**clumsy** ['klʌmzı] *adj* 1. ağır, ləng, təhərsiz; yavaştərpənən; **~ fingers** yöndəmsiz barmaqlar; **~ gesture** ağır/ləng jest *(əl-qol hərəkəti);* 2. yöndəmsiz, biçimsiz, qaba, yaraşıqsız; **~ furniture** yöndəmsiz/yaraşıqsız mebel; **~ shoes** narahat/yöndəmsiz ayaqqabı; **~ verse** biçimsiz şer; 3. kobud, ədəbsiz; yersiz

**cluster[1]** ['klʌstə'] *n* 1. salxım; dəstə; **~ of grapes** bir salxım üzüm; **a ~ of bees** bir dəstə arı; **a ~ of flowers** bir dəstə gül; **a ~ of spectators** bir dəstə tamaşaçı; 2. qrup; **a ~ of islands** bir qrup ada; **~ of stars** bir qrup ulduz

**cluster[2]** ['klʌstə'] *v* 1. salxım halında böyümək; 2. qrup halında yığışmaq, toplaşmaq; *A group of old women clustered round her Bir qrup qoca arvad onun ətrafına toplaşdı;* 3. sıx əlaqədə olmaq, assosiasiya edilmək, assosiasiya üzrə əlaqə yaratmaq; *Memories of the past clustered round the spot Keçmişin xatirələri bu yerlə qırılmaz surətdə bağlıdır*

**clustered** ['klʌstəd] *adj* 1. salxım şəklində inkişaf edən/böyüyən; 2. dəstəyə vurulmuş, dəstələnmiş

**clutch[1]** [klʌtʃ] *n* I 1. *pl* caynaq; pəncə, ayaq; 2. sıxma, sıxılma; tutma, yapışma; **to make a ~ (at)** tutmaq, yapışmaq *(bir şeydən);* 3. *məc.* məngənə; **in the ~ of poverty** kasıbçılığın məngənəsində; 4. *tex.* ilişmə, mufta *(halqa, bilərzik);* **to throw in /into the ~** muftanı qoşmaq/birləşdirmək;
◊ **to get/to fall into *smb.'s* ~es** bir kəsin caynağına keçmək; **to get out of *smb.'s* ~es** bir kəsin caynağından xilas olmaq / qurtarmaq

**clutch** [klʌtʃ] *n* II 1. yumurta olan yuva; 2. anasından ayrılmış balalar *(quş və ya heyvanların)*

**clutch[2]** [klʌtʃ] *v* I yapışmaq, tutmaq; *The child clutched my hand Uşaq əlimdən möhkəm yapışdı;* **to ~ at** tutmağa çalışmaq, tutmaq; *He clutched at a branch as he fell O yıxılarkən budaqdan yapışdı / tutmağa çalışdı;*
◊ *A drowning man will clutch at a straw at. söz. Suda boğulan saman çöpündən yapışar*

**clutch** [klʌtʃ] *v* II qırt/kürt yatıb bala çıxartmaq *(quşlar haq.)*

**clutter[1]** ['klʌtə'] *n* 1. *amer. dial.* səliqəsizlik; qarışıqlıq, hərc-mərclik; *The room is always in a clutter Otaqda həmişə səliqəsizlik hökm sürür;* 2. səs-küy, hay-haray

**clutter[2]** ['klʌtə'] *v* 1. qarışıqlıq / xaos yaratmaq; tökub-töküşdürmək, bir-birinin üstünə tökmək; *The desk was cluttered up with books Kitablar necə gəldi yazı stolunun üstünə tökülmüşdü;* 2. səs/səs-küy salmaq, gurultu qoparmaq, çığır-bağır salmaq; 3. anlaşılmaz bir surətdə danışmaq, aydın danışmamaq

**clyster[1]** ['klıstə'] *n tib.* imalə

**clyster[2]** ['klıstə'] *v tib.* imalə etmək

**clyster-pipe** ['klıstəpaıp] *n tib.* imalə borusu

**co-** [kou-] *pref İsim və fellərin tərkibində işlənərək birgəlik, ümumi işin bir yerdə görüldüyünü göstərir/bildirir:* **coeducation** bir yerdə təhsil alma *(oğlan və qızların);* **coeducation of boys and girls** oğlan və qızların bir yerdə oxuması/təhsil alması; **coauthor** həmmüəllif; **cooperator** əməkdaş; ***to coexist*** birgə/yanaşı yaşamaq

**coach[1]** [koutʃ] *n* I 1. karet *(hər tərəfi örtülü, dördtəkərli minik arabası),* minik *(fayton və s.); d.d.*

poçt kareti; 2. kupelərə bölünmüş sərnişin vaqonu; **day ~** yataq yeri olmayan minik vaqonu; 3. *amer.* yataq yeri olan vaqon; 4. şəhərlərarası turist avtobusu; 5. *dən.* kapitan kayutası

**coach** [koutʃ] *n* II 1. *d.d.* repetitor *(zəif şagirdi hazırlayan müəllim)*; 2. *id.* məşqçi; **a football ~** futbol məşqçisi; **national ~** ölkənin yığma komandasının məşqçisi

**coach**$^2$ [koutʃ] *v* I 1. karetdə aparmaq; 2. karetlə / faytonla getmək

**coach** [koutʃ] *v* II 1. təkrar etmək; zəif oxuyan şagirdə/tələbəyə kömək etmək; 2. repetitorla məşğul olmaq; şagirdi/tələbəni imtahana hazırlamaq; 3. *id.* məşq etmək, yarışa hazırlamaq; yarışa hazırlaşmaq; 4. *av.* gecə uçuşu zamanı təyyarəçiyə radio ilə təlimat vermək

**coach-box** ['koutʃbɔks] *n* eşşək *(tikintidə işlədilən hündür ayaqaltı)*

**coachee** [kou'tʃi:] *n d.d.* faytonçu, arabaçı

**coacher** ['koutʃə$^r$] *n* 1. qoşqu atı, fayton atı; 2. *arx.* faytonçu, arabaçı

**coachful** ['koutʃfl] *n* bir karet dolusu, bir karet / fayton dolusu

**coach-horse** ['koutʃhɔ:s] *n* = **coacher** *(1-ci mənada)*

**coachman** ['koutʃmən] *n* (*pl* **-men** [-mən]) faytonçu, arabaçı

**coach park** ['koutʃpa:k] *n* karetin/faytonun qısa müddətə saxlanıldığı park *(yer)*

**coach-whip** ['koutʃwɪp] *n* 1. faytonçu qamçısı; 2. loskut, parça kəsikləri

**coachy** [koutʃɪ] *n* = **coachee**

**coact** [kou'ækt] *v* birgə hərəkət etmək

**coagulability** [kou.ægjulə'bɪlɪtɪ] *n* laxtalanma *(qan haq.)*

**coagulable** [kou'ægjuləbl] *adj* laxtalanmağa / qatılaşmağa qabiliyyətli

**coagulate** [kou'ægjuleɪt] *v* qatılaşdırmaq, laxtalandırmaq; qatılaşmaq, laxtalanmaq, qəlizləşdirmək, qəlizləşmək

**coagulation** [kou.ægju'leɪʃn] *n* qatılaşma, qatılanma; laxtalaşma, laxtalanma

**coagulative** [kou'ægjuleɪtɪv] *adj* laxtalaşan, laxtalana bilən; qatılaşan, qatılaşa bilən

**coagulum** [kou'ægjuləm] *n* (*pl* **-la**) laxta, pıxtı

**coal**$^1$ [koul] *n* 1. kömür, daş kömür; **brown ~** boz kömür, liqnit; **hard / anthracite ~** antrasit *(daş kömürün ələ növü)*; **altogether ~** çeşidlənməmiş/növlərə ayrılmamış kömür; 2. yanan kömür; kömür parçası; **live ~** alovsuz yanan kömür, közərmiş kömür; 3. *pl d.d.* kömür *(yanacaq)*; **to lay in ~s for the winter** qışa kömür ehtiyatı görmək;

◊ **to be on hot ~s** ≅ iynə/tikan üstündə oturmaq; **to bear/to carry ~s** 1) ağır işlə məşğul olmaq; 2) özünün təhqiramiz vəziyyəti ilə razılaşmaq; **to carry ~s to Newcastle** Nyukasla kömür daşımaq/aparmaq; ≅ Naxçıvana duz aparmaq *(yəni mənasız/yararsız işlə məşğul olmaq)*

**coal**$^2$ [koul] *v* 1. kömürləşmək, kömürə dönmək /çevrilmək, yanıb kömür olmaq; kömürə döndərmək, kömürləşdirmək; 2. kömür yükləmək

**coal-basin** ['koul.beɪsn] *n* daş kömür hövzəsi

**coal-bearing** ['koul.beərɪŋ] *adj* daş kömür olan

**coal-bed** ['koulbed] *n* daş kömür qatı / layı

**coal-black** ['koul'blæk] *adj* kömür kimi qara

**coal-breaker** ['koul.breɪkə$^r$] *n* kömürdoğrayan maşın

**coal-dust** ['kouldʌst] *n* daş kömür tozu/xəkəsi

**coaler** ['koulə$^r$] *n* 1. *d.y. dən.* 1. kömürçü; 2. kömüryükləyən fəhlə

**coalesce** [.kouə'les] *v* 1. birləşmək, bitişmək *(sınmış sümük və s. haq.)*

**coalescence** [.kouə'lesns] *n* 1. yapışma, qovuşma, bitişmə, örtülmə *(göz haq.)*; 2. birləşmə *(qruplarda və s.)*

**coalescent** [.kouə'lesnt] *adj* bitişən, qaynayıb qarışan, yapışan

**coal-face** ['koulfeɪs] *n* kömür kəsmə; kəsilmiş kömürün qədəri

**coal-field** ['koulfi:ld] *n* kömür yatağı/çıxarılan yer

**coal-gas** ['koul'gæs] *n* işıq qazı

**coal-heaver** ['koul.hi:və$^r$] *n* kömürdaşıyan

**coal-hole** ['koulhoul] *n* kömür saxlamaq üçün zirzəmi

**coal-house** ['koulhaus] *n* kömür anbarı

**coaling** ['koulɪŋ] *n* kömür yüklənməsi, bunkerə kömür tökmə

**coaling-station** ['koulɪŋ.steɪʃn] *n* 1. *d.y.* kömür yüklənən stansiya; 2. *dən.* kömür yüklənən liman

**coalition** [.kouə'lɪʃn] *n* koalisiya, ittifaq, birləşmə; **to form a ~** koalisiya təşkil etmək; **to enter a ~** koalisiyaya daxil olmaq

**coalitional** [.kouə'lɪʃnl] *adj* koalisiya, koalision

**coalitionist** [.kouə'lɪʃnɪst] *n* koalisiya iştirakçısı

**coalize, -ise** ['kouəlaɪz] *v* koalisiya təşkil etmək, koalisiyaya daxil olmaq / girmək

**co-ally** [kou'ælaɪ] *n* müttəfiq

**coalman** ['koulmæn] *n* (*pl* **-men** [-mən]) 1. qazmaçı, kömürçıxaran *(fəhlə)*; 2. kömür sənayesi sahibi; 3. *dən.* kömürdaşıyan gəmi

**coal-master** ['koul.ma:stə$^r$] *n* = **coal-owner**

**coal-mine** ['koulmaɪn] *n* daş kömür şaxtası / mədəni

**coal-miner** ['koul.maɪnə$^r$] *n* qazmaçı; kömürçıxaran *(fəhlə)*

**coal-oil** ['koul'ɔɪl] *n* 1. xam neft; 2. mineral yağ

**coal-owner** ['koul.ounə$^r$] *n* daş kömür şaxtasının sahibi, şaxta sahibi

**coal-pit** ['koulpɪt] *n* = **coal-mine**

**coal-sack** ['koul'sæk] *n* kömür kisəsi

**coal-tar** ['koul'ta:] *n* daş kömür qətranı

**coaly** ['koulɪ] *adj* 1. kömürlü, tərkibində kömür olan; kömür; 2. kömür/qətran kimi qara; 3. kömür tozu / xəkəsi ilə örtülmüş

**coaptation** [.kouæp'teɪʃn] *n* 1. uyğunlaşdırma, düzəltmə; uyğunlaşdırılma, uyğunlaşma; 2. birləşdirmə və ya yaxınlaşdırma *(sınmış sümükləri, yaranın kənarlarını)*



**coarctate** [kou'a:kteɪt] *adj* sıx bitişən, sıx əlaqədə olan *(bədən üzvləri və s. haq.)*

**coarse** [kɔ:s] *adj* 1. qaba, kobud; **~ clothes** qaba paltar; **~ food** qaba yemək; **~ behaviour/joke** kobud rəftar/zarafat; **~ woolen garment** qaba yun paltar; **~ thread** cod / qaba sap; 2. iri, iridənəli; **~ sand** iri / iridənəli qum; 3. kələ-kötür, nahamar; işlənməmiş, tamamlanıb qurtarmamış; çiy; 4. kobud; tərbiyəsiz, ədəbsiz; **~ manners** ədəbsiz / kobud ədə / xasiyyət; 5. nalayiq; vulqar; **~ language** vulqar dil

**coarse-grained** ['kɔ:sgreɪnd] *adj* 1. iridənəli; 2. kobud, qaba, ədəbsiz *(adam haq.)*

**coarsely** ['kɔ:slɪ] *adv* kobud, qaba, tərbiyəsiz bir tərzdə

**coarsen** ['kɔ:sn] *v* 1. kobudlaşdırmaq, qabalaşdırmaq; 2. kobud / qaba danışmaq, kobud cavab vermək

**coarseness** ['kɔ:snɪs] *n* kobudluq, qabalıq, nəzakətsizlik, sərtlik

**coarticulate** [.kouaː'tɪkjuleɪt] *v* birləşdirmək, bağlamaq

**coast**$^1$ [koust] *n* 1. dəniz sahili/kənarı; sahil boyu; **on the ~** dəniz kənarında/sahilində; **off the French ~** Fransa sahillərində; **flat / steep /rocky ~** düz /sıldırımlı/ qayalı sahil; 2. *amer.* kirşə ilə sürüşmək üçün qar dağları; dağdan kirşə ilə sürüşmə

**coast**$^2$ [koust] *adj* sahil; **Coast Air Forces** *hərb.* sahil mühafizə aviasiyası, sahil aviasiyası; **Coast Artillery** *hərb.* sahil artilleriyası; **Coast Defence** *hərb.* sahil mühafizəsi/müdafiəsi; **Coast Guard** *amer.* dəniz sərhəd xidməti; **~ watch post** *amer.* sahil gözətçi postu;

◊ *The coast is clear Yol açıqdır, Manea yoxdur*

**coast**$^3$ [koust] *v* 1. sahil boyu üzmək; 2. *amer.* kirşə ilə dağdan sürüşmək; 3. *av.* inersiya ilə uçmaq; 4. vəcdə/cuşa gəlmək *(narkotik maddənin və ya musiqinin təsiri ilə)*

**coastal** ['koustəl] *adj* sahil; **~ waters** sahil suları; **~ submarine** sahil boyu hərəkət edən sualtı qayıq; **~ state** sahil boyunda yerləşən ştat; **~ patrol service** *hərb.* sahil patrul xidməti

**coaster** ['koustə$^r$] *n* 1. sahil gəmisi *(sahil boyunca bir limandan o biri limana üzən gəmi)*; 2. sahil rayonlarının sakini; 3. qrafin üçün gümüş podnos *(adət. təkər üstündə)*; stəkan və ya butulka üçün altlıq; 4. *amer.* dağdan sürüşmək üçün kirşə; 5. kirşə ilə dağdan sürüşmə həvəskarı

**coaster break** ['koustəbreɪk] *n tex.* velosipeddə ayaq tormozu/əyləci

**coast-guard**$^1$ ['koustga:d] *n* 1. sahil keşikçi dəstəsi; 2. sahil gömrük mühafizə dəstəsi

**coast-guard**$^2$ ['koustga:d] *adj* sahil; **~ station** *hərb.* sahil sərhəd postu/məntəqəsi, dəniz sərhəd postu

**coasting** ['koustɪŋ] *n* 1. sahil gəmiçiliyi; 2. *id.* inersiya ilə qaçma; 3. *tex.* inersiya ilə hərəkət etmə; 4. *av.* inersiya ilə uçma

**coasting-trade** ['koustɪŋ'treɪd] *n* sahil ticarəti

**coasting-vessel** ['koustɪŋ'vesl] *n* sahil gəmisi

**coast-line** ['koustlaɪn] *n* sahil xətti

**coast-man** ['koustmən] *n* (*pl* **-men** [-mən]) sahil zolağında yaşayan sakin

**coast-waiter** ['koust.weɪtə$^r$] *n* gömrükxana yoxlayıcısı

**coastwise**$^1$ ['koustwaɪz] *adj* sahil, kabotaj; **~ traffic** sahil üzgüçülüyü, sahillə üzmə

**coastwise**$^2$ ['koustwaɪz] *adv* sahil boyunca; **to sail ~** sahil boyunca üzmək

**coat**$^1$ [kout] *n* 1. pencək; mundir *(rəsmi paltar)*; frenç *(üstdən dörd böyük cibi olan əsgəri pencək)*; kitel *(hərbi pencək)*; **tail ~** frak *(qabaq ətəkləri kəsik, dal tərəfdən isə uzun dar ətəkləri olan sürtük)*; palto; **~ and skirt** qadın kostyumu; 2. xəz, yun; dəri *(heyvan dərisi)*; tük, lələk *(quşlarda)*; 3. *anat.* pərdə, qişa; 4. örtük, qat; **~ of snow** qar örtüyü; **~ of paint /varnish /dust** boya / lak / toz qatı; 5. üz vurma / çəkmə, üz; **to give the walls a second ~ of paint** divarlara ikinci dəfə boya /rəng vurmaq / çəkmək;

◊ **to wear the king's / the queen's ~** ingilis ordusunda xidmət etmək; **to dust** *smb.***'s ~** bir kəsi kötəkləmək / döymək; **to turn** *one's* **~** əqidəsini dəyişmək, düşmən tərəfə keçmək; **to take off** *one's* **~** dalaşmağa/vuruşmağa hazırlaşmaq; **to take off** *one's* **~ to the work** qollarını çırmayıb işə girişmək; **to cut the /** *one's* **~ according to the /** *one's* **cloth** ≅ ayağını yorğanına görə uzatmaq

**coat**$^2$ [kout] *v* 1. qatla örtmək; örtülmək, basmaq; **to ~ wood with paint** taxtaya boya çəkmək, taxtanı rəngləmək; *The table was coated with / in dust Stolu toz örtmüşdü/basmışdı*; 2. astarlamaq, astar çəkmək *(rənglə)*; 3. üz çəkmək

**coated** ['koutɪd] *adj* 1. örtülü, örtülmüş *(bir şeylə)*; **pills ~ with sugar** şəkərlə örtülmüş həblər; 2. üz çəkilmiş

**coating** ['koutɪŋ] *n* 1. qat, lay; təbəqə *(boya və s. haq.)*, örtük; **~ of white** ağ boya/ rəng qatı; 2. palto tikmək üçün parça

**coatless** ['koutlɪs] *adj* 1. paltosuz; 2. gerbi olmayan

**coat-room** ['koutru:m] *n* = **cloak-room**

**coat-tail** ['koutteɪl] *n* dal ətək *(sürtükdə, frakda)*

**co-author** [kou'ɔ:θə$^r$] *n* həmmüəllif, şərik müəllif, ortaqlı əsər yazan müəlliflərdən biri

**coax**$^1$ [kouks] *n* 1. yaltaq, qılığa girən *(adam)*; 2. yaltaq nitq

**coax**$^2$ [kouks] *v* 1. tovlamaq, ələ almaq, dilə tutmaq; öz tərəfinə çəkmək, qılığına girmək, aldatmaq; 2. yaltaqlıq/dilə tutma yolu ilə əldə etmək *(nəyisə)*; **to ~ a secret out of smb.** bir kəsdən sirr almaq *(yaltaqlıq, tovlamaq, qılığa girmək yolu ilə)*; **to ~ smb. out of his money** bir

kəsdən pul qoparmaq *(tovlamaq, dilə tutmaq yolu ilə)*; 3. səbirlə/hövsələ ilə əldə etmək *(bir şeyi)*; **to ~ a fire to burn** səbirlə / hövsələ ilə ocaq yandırmaq
**coaxing** ['kouksıŋ] *n* tovlama, dilə tutma, qılığına girmə, ələ alma
**cob**[1] [kɔb] *n* I 1. erkək qu *(quş)*; 2. *bot.* qarğıdalı qıcasının cecəyi; 3. qısa qıçlı, alçaq, möhkəm gövdəli at; 4. *bot.* qoz
**cob** [kɔb] *n* II qaya, qayma *(iri daş, buz və s. parçası)*
**cob** [kɔb] *n* III *zool.* qağayı
**cob**[2] [kɔb] *v* I. külçəni/filizi əllə parçalamaq/xırdalamaq; 2. vurmaq, zərbə endirmək; 3. *dən.* dənizçiyə coza vermək, dənizçini cəzalandırmaq; 4. döymək *(taxılı)*
**cobalt** [kə'bɔ:lt] *n kim.* kobalt *(maqnitləşmə qabiliyyəti olan ağ-gümüşü metal)*
**cobble**[1] ['kɔbl] *n* I çay / çaylaq daşı
**cobble** ['kɔbl] *n* II kobud / yöndəmsiz yamaq *(ayaqqabıda)*; kobud tikiş
**cobble**[2] ['kɔbl] *v* I yola çay/çaylaq daşı döşəmək
**cobble** ['kɔbl] *v* II kobud tərzdə yamamaq *(adət. ayaqqabını)*; yamaq qoymaq/salmaq
**cobbler** ['kɔblə[r]] *n* pinəçi *(ayaqqabı yamayan)*
**cobblers** ['kɔbləz] *n sl.* cəfəngiyat, boş danışıq; *I've never heard such cobblers in my life Mən ömrümdə heç vaxt belə cəfəngiyat eşitməmişəm*
**cobbling** ['kɔblıŋ] *n* ayaqqabı yamama
**cobby** ['kɔbı] *adj* 1. alçaqboylu, balacaboylu, qısaboy, qısaboylu; enlikürək; 2. özbaşına, kefi istədiyi kimi hərəkət edən, öz bildiyini edən; tərs, inad, inadcıl, inadkar; 3. *dial.* möhkəm, sağlam; yekə, zorba
**cob crusher** ['kɔb.krʌʃə[r]] *n k.t.* qarğıdalı təmizləyən maşın *(qarğıdalını dənələyən)*
**co-belligerent** ['kɔbı'lıdʒərənt] *n* müttəfiq *(müharibədə)*, müharibə aparan tərəf
**cob-loaf** ['kɔblouf] *n* kökə, qoğal
**cob-nut** ['kɔbnʌt] *n* 1. *bot.* fındıq ağacı *(meşədə)*; 2. fındıq *(meyvə)*; 3. qoz-qoz oyunu *(uşaq oyunu)*
**cobra** ['koubrə] *n zool.* kobra, eynəkli ilan
**co-brother** [kou'brʌðə[r]] *n* yoldaş, sənət/peşə yoldaşı, həmsənət
**cob-swan** ['kɔbswɔn] *n* = **cob**[1]
**cobweb** ['kɔbweb] *n* 1. hörümçək toru; 2. hörümçək torunun bir sapı; 3. *pl* hiylə, kələk, biclik, fırıldaq; 4. tor, tələ;
◊ **~ morning** dumanlı səhər; **to blow away the ~ from** *one's* **mind** gəzməyə / havasını dəyişməyə çıxmaq
**cobwebbed** ['kɔbwebd] *adj* torla örtülmüş
**cobweb bird** ['kɔbweb'bə:d] *n zool.* milçəktutan *(quş)*
**cobwebby** ['kɔb.webı] *adj* torabənzər
**coca** ['koukə] *n bot.* koka *(yarpaqlarından kokain alınan tropik ağac)*, kokain ağacı
**Coca-Cola** ['koukə'koulə] *n* koka-kola

**cocaine**[1] [kə'keın] *n əcz.* kokain *(narkotik maddə)*
**cocaine**[2] [kə'keın] *adj* kokain; **~ addict** kokainçi, kokain çəkən / düşkünü
**cocainize** [kə'keınaız] *v* kokain yeritmək / vurmaq *(iynə ilə)*
**co-chairman** ['kou'tʃeəmən] *n* (*pl* **-men** [-mən]) həmsədr, sədrlərdən biri
**cock** [kɔk] *n* I 1. xoruz; **the ~ of the wood** *amer. zool.* Sibir xoruzu; **fighting ~** döyüşən xoruz; 2. xoruz banı; 3. hərdəmxəyal / fikrini tez-tez dəyişən adam; 4. *d.d.* davakar, dalaşqan / savaşqan adam; dava salan; **~ of the school** məktəbdə ən davakar/davacıl *(şagird)*; 5. *hərb.* tətik *(silahda)*; 6. əqrəb *(günəş saatında)*; 7. *av.* təyyarəçinin oturduğu yer; 8. *tabu.* cinsi orqan *(kişilərdə)*, penis;
◊ **old ~** dost; **~ of the walk, ~ of the dunghill** 1) vacib adam/şəxs, yerli başçı; 2) vəziyyətin sahibi; **to live like a fighting ~** dəbdəbə/cahcalal içərisində yaşamaq; **~ and bull story/tale** uydurma, yalan, yalan-palan; **to knock into a ~** 1) döymək, əzişdirmək; 2) darmadağın etmək, külünü göyə sovurmaq; *That cock won't fight!* ≅ *Bu nömrə keçməz!*
**cock** [kɔk] *n* II yuxarı ayağa qoyulmuş/yuxarı qaldırılmış çaxmaq *(silahda)*
**cock** [kɔk] *n* III xotma, taya
**cock** [kɔk] *n* IV 1. mənalı/təsirli hərəkət; 2. şlyapanın kənarlarını yuxarı qaldırma
**cock**[2] [kɔk] *v* I 1. qaldırmaq, şəkləmək *(qulağı: heyvan haq.)*; **to ~ the ears** qulaqlarını şəkləmək *(heyvan haq.)*; **to ~ the nose** burnunu yuxarı tutmaq *(lovğalanmaq)*; **to ~ the eye** *d.d.* çoxmənalı baxışmaq; göz eləmək/etmək/vurmaq; **to ~ the hat** papağı yan/çəp qoymaq; 2. xoruz öyrətmək;
◊ **to ~ *one's* nose** ölmək
**cock** [kɔk] *v* II çaxmağı yuxarı ayağa qoymaq / qaldırmaq
**cock** [kɔk] *v* III taya/xotma vurmaq *(quru otdan)*
**cockade** ['kɔ'keıd] *n* kokarda *(rəsmi papaqlara vurulan dəmir nişan)*
**cock-a-doodle-doo** ['kɔkədu:dl'du:] *n* quqqulu-qu *(xoruz banlaması)*
**cock-a-hoop** ['kɔkə'hu:p] *adj* 1. şadlıq/şənlik edən, sevinən, şadlanan; 2. özünübəyənən, özündən razı olan, özünü başqalarından üstün tutan; məğrur; özünü öyən, özündən bədgüman, lovğa
**cockchafer** ['kɔk.tʃeıfə[r]] *n* may böcəyi, xırıldaq *(böcək)*
**cock-crow** ['kɔkkrou] *n* 1. xoruz banı *(səs)*; 2. *məc.* şəfəq, dan yeri
**cock-crowing** ['kɔkkrouıŋ] *n* = **cock-crow**
**cocked** [kɔkt] *adj* yuxarı qatlanmış/əyilmiş; **~ hat** yanları yuxarı qatlanmış üçkünclü şlyapa
**cocker**[1] ['kɔkə[r]] *n* I 1. xoruz döyüşü həvəskarı; 2. döyüşən xoruz sahibi; 3. koker-spanel *(ov iti)*
**cocker** ['kɔkə[r]] *n* II 1. tayavuran *(adam)*; 2. məhsul toplayan



**cocker**[2] ['kɔkə[r]] *v* oxşamaq, əzizləmək, nazlamaq; nəvaziş göstərmək, ərköyün böyütmək *(uşağı)*
**cockerel** ['kɔkərəl] *n* beçə
**cock-eye** ['kɔkaı] *n* çəpgöz *(adam)*
**cock-eyed** ['kɔkaıd] *adj* 1. çəpgöz, qıyıqgöz, əyrigöz, çaş; 2. sərxoş, kefli
**cock-fight** ['kɔkfaıt] *n* xoruz döyüşü
**cock-fighting** ['kɔk.faıtıŋ] *n* xoruz döyüşü;
◊ **to beast ~** ötüb keçmək, üstün gəlmək, geridə buraxmaq
**cock-horse** ['kɔk'hɔ:s] *n* 1. oyuncaq at; 2. böyük yekəpər at; ayğır;
◊ **to ride a ~** lovğalanmaq, iddia satmaq, özünü öymək; qudurmaq
**cockle**[1] ['kɔkl] *n* I 1. *bot.* qaramuq otu *(əkilən)*; 2. *bot.* kəfləndirici dəlicə buğda *(alaq otu)*
**cockle** ['kɔkl] *n* II qırış, sığallı səthdə cızıq *(kağızda, parçada və s.)*
**cockle** ['kɔkl] *n* III mayotu qurutmaq üçün soba / peç
**cockle** ['kɔkl] *n* IV 1. yeməli mollyusk *(onurğasız yumşaqbədənli dəniz heyvanı)*; 2. mollyusk qabığı
**cockle**[2] ['kɔkl] *v* 1. bürüşmək, qırışmaq; qırışla örtülmək; əyilmək, qabarmaq *(istidən, nəmdən; kağız, cild və s.)*; 2. köpüklü dalğalarla örtülmək *(dəniz haq.)*
**cockle-shell** ['kɔklʃel] *n* mollyusk qabığı
**cockle-stairs** ['kɔklsteəz] *n pl* dolama pilləkən
**cockney** ['kɔknı] *n* 1. kokni *(Londonda danışılan ləhcə dil)*; 2. Londonlu *(xüs. şərq hissədə yaşayan)*
**cockpit** ['kɔkpıt] *n* 1. xoruz döyüşü üçün meydan; 2. *dən.* kubrik *(gəmidə alt paluba)*; 3. *av.* açıq kabinə; 4. açıq kuzov *(yarış avtomobilində)*
**cockroach** ['kɔkroutʃ] *n* 1. tarakan; 2. tarakan fəsiləsindən olan böcəklər
**cockscomb** ['kɔkskoum] *n* 1. xoruz pipiyi; 2. təlxək papağı
**cock-shut**[1] ['kɔkʃʌt] *n dial.* toran, qaş qaralan vaxt, alaqaranlıq
**cock-shut**[2] ['kɔkʃʌt] *adj* toran; **~ light/time** toran, toyuqların tarlanan vaxtı, toyuqların hinə yığılan vaxtı
**cockspur** ['kɔkspə:[r]] *n bot.* yemişan
**cock-sure** ['kɔk'ʃuə[r]] *adj d.d.* 1. **(of, about)** əmin, arxayın, xatircəm, inanmış; əzmli; 2. özünə qürrələnən/güvənən/inanan/arxayın olan; 3. labüd, qaçılmaz, zəruri *(hadisə haq.)*
**cocksy** ['kɔksı] *adj* 1. özünə qürrələnən / güvənən; 2. cəsarətli, ürəkli, ötkəm, lovğa, məğrur, mütəkəbbir; 3. sırtıq, utanmaz, abırsız, həyasız, ədəbsiz
**cocktail** ['kɔkteıl] *n* 1. kokteyl *(ədviyyat qatılmış spirtli şirin içki)*; 2. *amer.* sous qatmaqla krab və istridiyədən hazırlanmış qəlyanaltı/məzə; 3. quyruğu kəsilmiş at; 4. bambılı, layiq olmadığı mövqeyi tutan adam
**cock-tailed** ['kɔkteıld] *adj* 1. quyruğu kəsilmiş *(at haq.)*; 2. dik quyruqlu

**cockup** ['kɔkʌp] *n* 1. yuxarı əyilmiş uc *(bir şey)*; 2. qabaqdan yanları yuxarı əyilmiş şlyapa
**cockweed** ['kɔkwi:d] *n* 1. *bot.* vəzəri, acıtərə; 2. *bot.* qaramuq otu
**cocky** ['kɔkı] *adj: d.d.* ədəbsiz, qaba, kobud, sözqaytaran; ötkəm, məğrur, lovğa; sırtıq, utanmaz, abırsız, həyasız
**coco** ['koukou] *n bot.* 1. hind qozu ağacı; 2. hind qozu *(meyvə)*
**cocoa** ['koukou] *n* 1. kakao; 2. kakao içkisi
**cocoa bean** ['koukou'bı:n] *n* kakao paxlası
**cocoa nib** ['kou'kou'nıb] *n* qabıqdan çıxarılmış kakao dənəsi
**cocoa powder** ['koukou'paudə[r]] *n* boz barıt
**coconut** ['koukənʌt] *n* hind qozu
**coconut tree** ['koukənʌt'tri:] *n* hind qozu ağacı
**cocoon**[1] [kə'ku:n] *n* barama
**cocoon**[2] [kə'ku:n] *v* barama istehsal etmək
**cocotte** [kə'kɔt] *n fr.* yüngülxasiyyətli qadın, fahişə
**cod**[1] [kɔd] *n* I *(təki, cəmi eyni formada işlənir) zool.* treska *(Şimal Dənizində yaşayan balıq növü)*
**cod** [kɔd] *n* II *d.d.* gic, axmaq, səfeh, qəribə adam
**cod**[2] [kɔd] *v* I treska ovlamaq / tutmaq
**cod** [kɔd] *v* II ələ salmaq, oynatmaq, araya / lağa qoymaq; aldatmaq
**coda** ['koudə] *n mus.* koda *(musiqi pyesində əsas mövzunu qısaca təkrar edən son hissə)*
**coddle**[1] ['kɔdl] *n d.d.* ərköyün, nazlı; nadinc, dəcəl, ərköyün uşaq
**coddle**[2] ['kɔdl] *v* I qulluq etmək, baxmaq *(xəstəyə və s.)*; nazlamaq, nazla bəsləmək/baxmaq/tərbiyə etmək, nazı ilə oynamaq
**coddle** ['kɔdl] *v* II qaynatmadan yavaş-yavaş bişirmək *(xüs. meyvəni)*
**code**[1] [koud] *n* 1. kodeks *(sistemə salınmış qanunlar külliyyatı)*; **civil ~** mülki kodeks; **criminal ~** cinayət kodeksi; **~ of commerce** ticarət kodeksi; **Black Code** *amer.* "Qara kodeks" *(quldarlıq qanunları: quldarlığın ləğv edilməsinə qədər olan)*; 2. qanunlar, qaydalar, prinsiplər *(əxlaq, şərəf və s. haq.)*; **moral ~** əxlaq qaydaları; **~ of honour** şərəf qanunları; 3. kod; *(şərti ixtisarlar sistemi)*; **Morse ~** Morze kodu; **telegraphic ~** teleqraf kodu
**code**[2] [koud] *v* 1. kodifikasiya etmək, kodeks halına/sistemə salmaq *(qanunları)*; 2. kodlamaq, kodla işarələmək, şifrələmək
**co-debtor** [kou'detə[r]] *n hüq.* borc şəriki/ortağı
**co-defendant** ['koudı'fendənt] *n hüq.* başqası ilə birlikdə cavabdeh olan *(şəxs)*, ikinci cavabdeh
**codeine** ['koudi:n] *n əcz.* kodein *(ağrıkəsən dərman)*
**codification** [.kɔdıfı'keıʃn] *n hüq.* kodifikasiya *(qüvvədə olan qanunların sistemə salınması)*
**codifier** ['kɔdıfaıə[r]] *n* kodifikator *(kodifikasiya ilə məşğul olan adam)*
**codify** ['kɔdıfaı] *v* 1. kodifikasiya etmək, kodeks

halına salmaq *(qanunları)*; 2. sistemləşdirmək, sistem halına salmaq
**codling** ['kɔdlɪŋ] *n* I 1. xırda və ya cavan treska; 2. *amer.* treska zümrəsindən olan balıqlar
**codling** ['kɔdlɪŋ] *n* II 1. *bot.* cır/yabanı alma; 2. dovşankələmi
**co-education** ['kou.edju:'keɪʃn] *n* oğlan və qızların birgə təhsil alması
**co-educational** ['kou.edju:'keɪʃnl] *adj* birgə təhsilə *(oğlanlarla qızların)* aid olan; birgə təhsil; ~ **system** birgə təhsil sistemi
**coefficient**[1] [.koui'fɪʃənt] *n* 1. əmsal; ~ **of efficiency** faydalı iş əmsalı; ~ **of expansion** genişlənmə əmsalı; ~ **of safety** təhlükəsizlik əmsalı; 2. təsiredici faktor
**coefficient**[2] [.koui'fɪʃənt] *adj* təsiredici, təsir göstərən
**coenobite** ['si:nəbaɪt] *n* rahib; zahid, asket
**coenoby** ['si:nəbɪ] *n* monastır
**coequal** [kou'ɪ:kwəl] *adj* başqasına bərabər *(rütbəcə və s.)*
**coerce** [kou'ə:s] *v* 1. tutmaq, saxlamaq, tutub saxlamaq; 2. məcbur/vadar etmək; **to ~ *smb.* into silence** bir kəsi susmağa məcbur/vadar etmək; **to ~ *smb.* to sign a document** bir kəsi bir sənədə qol çəkməyə məcbur/vadar etmək; 3. *amer.* məcbur/vadar etmək yolu ilə bir şeyi əldə etmək; **to ~ obedience** məcburiyyət sayəsində itaət etməyə nail olmaq; **to ~ compliance with the conditions of a contract** kontraktın/müqavilənin şərtlərini yerinə yetirməyə məcbur/vadar etmək
**coercion** [kou'ə:ʃn] *n* 1. saxlama, tutub saxlama *(güclə)*; cilovlama, cilovlanma; 2. məcbur /vadar etmə, məcburiyyət; **under** ~ məcburən; 3. iğtişaşın / qarışıqlığın qarşısını almaq üçün zor işlətmə; 4. fiziki təzyiq; sıxma, sıxılma
**coercive** [kou'ə:sɪv] *adj* məcburi, icbari; ~ **methods** məcburi / icbari metodlar
**coeval**[1] [kou'i:vəl] *n* 1. yaşıd, həmyaş; 2. həməsr, müasir, bir əsrin/dövrün adamı
**coeval**[2] [kou'i:vəl] *adj* 1. eyni vaxtda baş verən /mövcud olan; *The custom is coeval with Christianity in England Bu adət İngiltərədə xristianlıqla eyni vaxtda yaranıb;* 2. eyniyaşlı, həmyaş, yaşıd; *She is coeval with me O mənimlə həmyaşdır / yaşıddır*
**co-exist** ['kouɪg'zɪst] *v* **(with, together with)** bir yerdə yaşamaq, eyni zamanda mövcud olmaq, yan-yana yaşamaq, yanaşı yaşamaq
**coexistence** ['kouɪg'zɪstəns] *n* bir yerdə yaşama, eyni zamanda mövcud olma/yaşama, yan-yana / yanaşı yaşama; **peaceful** ~ dinc yanaşı yaşama
**coexistent** ['kouɪg'zɪstənt] *adj* bir yerdə yaşayan, eyni zamanda mövcud olan, eyni zamanda/ yan-yana / yanaşı yaşayan
**coextensive** ['kouɪks'tensɪv] *adj* zaman və ya məkanca eyni müddət davam edən

**cofactor** [kou'fæktə'] *n riyaz.* birgə təsir edən faktor
**coffee** ['kɔfɪ] *n* 1. qəhvə; **black** ~ qara qəhvə; **white** ~ südlə içilən qəhvə, südlü qəhvə; 2. bir fincan qəhvə; *We'll have two coffees, please Zəhmət olmasa, bizə iki fincan qəhvə ver / verin;*
◊ ~ **cooler** özünü işə verməyən adam, asan yolla pul qazanmaq istəyən adam; ~ **and cakes** *amer.* az miqdar/məbləğ pul; az maaş /məvacib /aylıq/donluq; —**and-cake job** azmaaşlı iş
**coffee-bean** ['kɔfɪ'bi:n] *n* qəhvə paxlası
**coffee-berry** ['kɔfɪ'berɪ] *n bot.* qəhvə ağacı / meyvəsi
**coffee-cup** ['kɔfɪkʌp] *n* qəhvə fincanı
**coffee-grinder** ['kɔfɪ.graɪndə'] *n* qəhvəüyüdən maşın
**coffee-grounds** ['kɔfɪgraundz] *n pl* qəhvə xıltı
**coffee-house** ['kɔfɪhaus] *n* qəhvəxana, kafe
**coffee-mill** ['kɔfɪmɪl] *n* qəhvə dəyirmanı, qəhvəüyüdən
**coffee-palace** ['kɔfɪ.pælɪs] *n* = **coffee-house**
**coffee-pot** ['kɔfɪpɔt] *n* qəhvədan, qəhvə bişirilən qab
**coffee-room** ['kɔfɪru:m] *n* kafe, ümumi yeməkxana *(mehmanxanada)*
**coffee shop** ['kɔfɪʃɔp] *n* bufet, kafe *(adətən mehmanxanada)*
**coffee-stall** ['kɔfɪstɔ:l] *n* isti qəhvə satmaq üçün səyyar laryok/alver budkası/piştaxta
**coffee-tree** ['kɔfɪ'trɪ:] *n bot.* qəhvə ağacı
**coffer**[1] ['kɔfə'] *n* 1. pul, zinət şeyləri və s. saxlamaq üçün sandıqça; 2. *tik.* kesson; 3. *pl* xəzinə
**coffer**[2] ['kɔfə'] *v* 1. *tik.* kessonlaşdırmaq; 2. *arx.* sandıqda gizlətmək; sandıqda pul saxlamaq *(qara gün üçün)*
**coffin**[1] ['kɔfɪn] *n* tabut
**coffin**[2] ['kɔfɪn] *v* tabuta qoymaq
**coffle** ['kɔfl] *n* karvan
**coffret** ['kɔfrɪt] *n* sandıqça, mücrü
**cog**[1] [kɔg] *n* I balaca balıqçı qayığı
**cog** [kɔg] *n* II diş *(mişarda, təkərdə, daraqda, çarxda və s.)*; ~ **in a machine** maşının vinti
**cog**[2] [kɔg] *v* I təkərin dişini sıxmaq
**cog** [kɔg] *v* II 1. aşıq-aşıq oyununda fırıldaq gəlmək; 2. aldatmaq, kələkbazlıq / biclik etmək, fırıldaq işlətmək
**cogency** ['koudʒənsɪ] *n* 1. inandırıcılıq, əsaslılıq, sübutluluq, danılmazlıq, şəksizlik, şübhəsizlik, aşkarlıq, qətilik, təkzib edilməzlik; *The cogency of the priest's arguments made me believe in God Keşişin dəlillərinin qətiliyi / şəksizliyi məni Allaha inanmağa təhrik etdi;* 2. inandırıcı dəlil / sübut / əsas
**cogent** ['koudʒənt] *adj* inandırıcı, əsaslı, sübutlu; danılmaz, danışıqsız, təkzibedilməz, aydın, şübhəsiz, aşkar; ~ **reason** əsaslı/inandırıcı səbəb; ~ **argument** təkzibedilməz / əsaslı sübut; *I have cogent reasons for voting for the work-*



*ers' party Fəhlə partiyasına səs vermək üçün mənim əlimdə əsaslı səbəblər var*
**cogged** [kɔgd] *adj* dişli, diş-diş
**cogger** ['kɔgə'] *n* 1. haramzadə, hiyləbaz; kələkbaz, fırıldaqçı, kartbasan; 2. cibgir, oğru
**cogitable** ['kɔdʒɪtəbl] *adj* düşünülən, fikrə gələn; ağlasığan, ağlabatan
**cogitate** ['kɔdʒɪteɪt] *v* 1. fikirləşmək, ətraflı surətdə götür-qoy etmək, düşünmək; **to ~ over the past** keçmiş haqda düşünmək / fikirləşmək; 2. fikirləşib tapmaq, hazırlamaq, icad etmək; **to ~ a scheme** plan hazırlamaq; *The man is cogitating mischief against us Bu adam bizə qarşı bədxahlıq etmək haqqında düşünür*
**cogitation** [.kɔdʒɪ'teɪʃn] *n* 1. ətraflı şəkildə fikirləşmə / götür-qoy etmə; 2. *pl* fikir, plan; **the ~s and purposes of your adversaries** sənin/sizin rəqiblərinin/rəqiblərinizin planları və niyyətləri
**cogitative** ['kɔdʒɪtətɪv] *adj* 1. təfəkkür; ~ **faculties** təfəkkür qabiliyyəti; 2. fikirləşən, düşünən; düşüncəli
**cognac** ['kounjæk] *n* konyak
**cognate**[1] ['kɔgneɪt] *n* 1. *hüq.* qan qohumu; 2. qohum dil
**cognate**[2] ['kɔgneɪt] *adj* 1. qan qohumluğu olan, həmqəbilə; 2. qohum, mənşəyi ümumi olan *(dil və s. haq.)*; **geometry and the ~ sciences** həndəsə və ona qohum olan elmlər; *English Dutch and German are cognate languages İngilis, holland və alman dilləri qohum dillərdir;* 3. eyni kökdən əmələ gəlmiş *(söz haq.)*; ~ **object** *qram.* koqneyt tamamlıq *(fellə eyni kökdən olan isimlə ifadə olunmuş məs. He fought a terrible fight cümləsində olduğu kimi)*; 4. oxşar, yaxın, bənzər; ~ **tastes** oxşar zövqlər; ~ **ideas** oxşar/ bənzər fikirlər
**cognation** [kɔg'neɪʃn] *n* 1. soy qohumluğu; 2. qohumluq *(söz, dil haq.)*
**cognition** [kɔg'nɪʃn] *n* 1. bilik, məlumat; idrak; 2. dərk etmə qabiliyyəti / bacarığı
**cognitive** ['kɔgnɪtɪv] *adj* idrak, dərketmə; ~ **power** idrak/dərketmə gücü/qabiliyyəti
**cognizable** ['kɔgnɪzəbl] *adj* 1 məhkəməyə aid; 2. *fəls.* dərk edilən / edilə bilən
**cognizance** ['kɔgnɪzəns] *n* 1. bilik, məlumat; **to have ~ of *smth.*** bir şey haqqında məlumatı olmaq; 2. kompetensiya, səriştə, bilik, təcrübə; **to be/to come / to fall within / under *smb.'s* ~** bir kəsin kompetensiyası/səlahiyyəti daxilində olmaq; 3. *hüq.* yurisdiksiya məhkəməyə aid olma, məhkəməlik; **to fall under the ~ of a court** məhkəməlik olmaq, məhkəmə yurisdiksiyasına aid olmaq; 4. fərqləndirici nişan; nişan
**cognize, -ise** [kɔg'naɪz] *v* 1. görmək, müşahidə etmək; sezmək, anlamaq, duymaq; hiss etmək; 2. *fəls.* dərk etmək
**cognomen** [kɔg'noumen] *n* 1. soyad, familiya; 2. ayama, ləqəb

**cognominal** [kɔg'noumɪnl] *adj* eyniadlı, eyni soyadlı
**cohabit** [kou'hæbɪt] *v* 1. birgə / yanaşı yaşamaq; *Can peace and freedom cohabit in the modern world? Sülh və azadlıq müasir dünyada yanaşı yaşaya bilərmi?*; 2. nikahsız yaşamaq/cinsi əlaqədə olmaq; *They were cohabiting Onlar kəbinsiz/nikahsız yaşayırdılar*
**cohabitation** [.kouhæbɪ'teɪʃn] *n* 1. birgə/ yanaşı yaşama; 2. nikahsız yaşama / cinsi əlaqədə olma
**coheir** ['kou'eə'] *n hüq.* ortaq vərəsə, miras şəriki
**coheiress** ['kou'eərɪs] *n hüq.* ortaq vərəsə *(qız)*, miras şəriki *(qız)*
**cohere** [kou'hɪə'] *v* 1. bağlı olmaq, yapışdırılmaq; **the moral principles by which society ~s** cəmiyyəti birləşdirən mənəvi prinsiplər; 2. uzlaşmaq, uyğun gəlmək, həmahəng olmaq; *His version doesn't cohere with the known facts Onun izahatı məlum faktlarla uyğun gəlmir; Does his religions and his political beliefs cohere? Onun dini əqidəsi siyasi əqidəsi ilə uyğun gəlirmi?* 3. birgə hərəkət / fəaliyyət göstərmək üçün birləşmək
**coherence** [kou'hɪərəns] *n* 1. əlaqə; bağlama, bağlanma; qoşma, qoşulma; ilişmə, yapışma; ~ **of soil** *k.t.* torpağın yapışqanlığı; 2. rabitə, rabitəlilik, ardıcıllıq *(dəlillər, sübutlar haq.)*
**coherent** [kou'hɪərənt] *adj* 1. əlaqəli, məntiqi; ~ **thought** əlaqəli / məntiqi fikir; ~ **speech** məntiqi/əlaqəli nitq; *His arguments are coherent Onun sübutları / arqumentləri məntiqidir;* 2. anlaşılan, anlaşıla bilən, başa düşülən / düşülə bilən, aydın tələffüz edilən
**cohesion** [kou'hi:ʒn] *n* 1. əlaqə, birlik, həmrəylik, yekdillik; ~ **of the party** partiyanın birliyi / həmrəyliyi / yekdilliyi; **ideas that have no natural ~** daxili əlaqəsi olmayan fikirlər; 2. ilişmə, yapışma; 3. *bot.* bitişmə, qovuşma; 4. *tib.* bitişmə yeri
**cohesive** [kou'hi:sɪv] *adj* 1. yapışan, yapışqan; ilişmə qabiliyyətli; *Is water cohesive by nature or not? Su təbiətcə yapışqandır ya yox?* 2. əlaqəli; yekdil, əlaqədar; ~ **forces in society** cəmiyyətdə yekdil qüvvələr
**cohesively** [kou'hi:sɪvlɪ] *adv* yapışqanlı, yapışan bir tərzdə, əlaqədar olaraq, yekdil bir tərzdə
**cohesiveness** [kou'hi:sɪvnɪs] *n* əlaqəlilik, yekdillik; yapışqanlıq, yapışıqlıq
**cohort** ['kouhɔ:t] *n* 1. koqorta *(qədim Romada təxminən 600 nəfərlik qoşun dəstəsi; legionun onda biri)*; 2. *əsas. pl* dəstə, qoşun, ordu; 3. insan dəstəsi; 4. *amer.* tərəfdar, tərəfkeş; 5. iştirak edən, əli/əlbir olan; yoldaş, şərik *(pis əməldə, cinayətdə)*
**coif** [kɔɪf] *n* 1. papaq, şapka; ləçək; 2. dəbilqənin boyunu qoruyan hissəsi; 3. ali rütbəli vəkillərin geydiyi ağ papaq;
◊ **brother of the ~** ali rütbəli vəkil

**coil**[1] [kɔıl] *n* I 1. burum; halqa; qıvrım; **the ~ of snake** ilanın qıvrımı; 2. buxta *(səliqə ilə burulub yığılmış buraz)*; 3. *el.* qarqara, makara; 4. *tex.* spiral boru
**coil** [kɔıl] *n* II *dial.* ot tayası
**coil**[2] [kɔıl] *v* 1. halqa şəklində yumrulamaq *(kəndiri, məftili və s.)*; buxtaya halqa yığmaq *(burazı və s.)*; 2. sarımaq, dolamaq; *A serpent coiled round a tree İlan ağaca dolandı;* 3. burulmaq, qıvrılmaq
**coin**[1] [kɔın] *n* 1. pul, sikkə; **gold / silver / copper** ~ qızıl/gümüş/mis pul; **small** ~ xırda pul; **base** ~ saxta pul/sikkə; 2. *amer.* xırda pul; **false ~ 1)** saxta pul/sikkə; 2) saxtalaşdırma, saxtasını düzəltmə; saxtakarlıq, saxtakarlıq etmə; **current ~ 1)** çox işlək pul; 2) *məc.* geniş yayılmış fikir; 3. *mem.* künc daşı;
◊ **to pay** *smb.* **back in his own** ~ eyni yolla əvəzini çıxmaq / vermək
**coin**[2] [kɔın] *v* 1. zərb etmək/kəsmək *(sikkə, medal)*; **to be ~ing money** pul qazanmaq, tez bir zamanda dövlətlənmək/ varlanmaq; 2. uydurmaq, uydurulmaq, özündən düzəltmək; **to ~ a lie** yalan uydurmaq; 3. yeni söz / ifadə düzəltmək; **to ~ a word** yeni söz düzəltmək
**coinage** ['kɔınıdʒ] *n* 1. zərb etmə / edilmə, kəsmə, kəsilmə *(pul, medal)*; 2. sikkə; naxış *(metalda)*; 3. dəmir pul; 4. yeni söz və ifadə yaratma; **words of modern** ~ yeni yaradılmış sözlər, neologizm; 5. uydurma; özündən düzəltmə, xəyal, əfsanə; *This is merely the coinage of your brain Bu sadəcə olaraq sənin uydurmandır*
**coincide** [ˌkouın'saıd] *v* 1. uyğun/yeni olmaq, uyğun/düz / tən gəlmək; *Our tastes coincide Bizim zövqlərimiz uyğun gəlir;* 2. bir vaxtda olmaq, bir vaxta düşmək; **events that** ~ eyni vaxta düşən hadisələr; 3. uyğun / bərabər olmaq, düz gəlmək; *His expenditure coincides with his income Onun xərci gəlirinə uyğun gəlir;*
**coincidence** [kou'ınsıdəns] *n* 1. təsadüf; təsadüf etmə, bir vaxtda olma; **~ of space /of time/of number** məkanca/zamanca / miqdarca uyğun gəlmə/olma; 2. uyğunluq; *Is there any coincidence between his opinions and your own? Onun fikri ilə səninki/sizinki arasında uyğunluq varmı?*
**coincident** [kou'ınsıdənt] *adj* uyğun gələn, üst-üstə düşən; *His mother's death was coincident with his birth Anasının ölümü onun doğumu ilə üst-üstə düşdü; What has occurred is coincident with my hopes Baş vermiş hadisə mənim ümidimi doğrultdu*
**coiner** ['kɔınə'] *n* 1. saxta / qəlp pul kəsən; 2. saxtakar; fırıldaqçı, uydurmaçı
**cold**[1] [kould] *n* 1. soyuq; soyuqluq; şaxta, bərk soyuq; **intense/dreadful/murderous /piercing** ~ bərk/dəhşətli/son dərəcə bərk / sümüyə işləyən soyuq; **icy** ~ buz kimi soyuq; **to shiver/to tremble with** ~ soyuqdan əsmək; **to stay in the** ~ soyuqda qalmaq; 2. soyuqlama, soyuqdəymə; zökəm, tumov; **~ in the head/in the nose** zökəm, tumov; **to catch/to take (a) ~** soyuqlamaq, özünü soyuğa vermək; **to have a** ~ soyuq dəymək;
◊ **to be dead with** ~ bərk soyuqlamaq, soyuq sümüyünə işləmək
**cold**[2] [kould] *adj* 1. soyuq; **~ day/wind/ room** soyuq gün / külək / otaq; **~ hands / feet** soyuq əllər/ayaqlar; **to be** ~ üşümək; 2. soyuq, quru, qaşqabaqlı, üzügülməz; **~ welcome** soyuq qəbul; **~ heart** soyuq ürək; **~ greeting** quru/soyuq salamlaşma; *He is cold in manner O, davranışında sərtdir/qurudur;* **to give** *smb.* **a ~ look** bir kəsə soyuq nəzərlə baxmaq; 3. laqeyd, etinasız, maraqsız, hissiz; **to leave** *smb.* ~ bir kəsə qarşı laqeyd olmaq/qalmaq; *This story leaves him cold Bu əhvalat onu maraqlandırmır;* 4. sakit, təmkinli, ağır *(xasiyyət haq.)*; **~ reason** sakit tədbirlilik; **to take a ~ survey of the situation** vəziyyətlə sakit/təmkinlə tanış olmaq; təmkinlə şəraiti qiymətləndirmək;
◊ **~ snap** qəfil/qəflətən soyuq düşmə; **~ steel** soyuq silah; **~ war** soyuq müharibə; **~ warriors** soyuq müharibə tərəfdarları; **~ truth** çılpaq həqiqət; **to act in ~ blood** soyuqqanlıqla hərəkət etmək; **to show/to give** *smb.* **the ~ shoulder** bir kəsə qarşı laqeydlik göstərmək/laqeyd olmaq; bir kəsi soyuq qarşılamaq; **~ feet** qorxaqlıq, cəsarətsizlik; **to have ~ feet** qorxmaq, cəsarətsizlik etmək; **to throw ~ water on** *smb. məc.* bir kəsin üstünə soyuq su tökmək/səpmək, bir kəsin əlini işdən soyutmaq; **to turn down ~** *amer.* qətiyyətlə imtina etmək; **as ~ as ice** buz kimi soyuq
**cold-arms** ['koulda:mz] *n* soyuq silah
**cold-blooded** ['kould'blʌdıd] *adj* 1. soyuqqanlı, laqeyd, hissiz, biganə; 2. amansız, insafsız, rəhmsiz, zalım, daşürəkli, mürvətsiz; **~ murderer** amansız/zalım /rəhmsiz /daşürəkli qatil; **~ murder** qəsdən / biləRəkdən edilən qətl; 3. tez üşüyən, soyuğa davamsız/dözməyən; 4. *biol.* soyuqqanlı *(heyvanlar haq.)*
**cold-bloodedly** ['kould'blʌdıdlı] *adv* soyuqqanlılıqla, amansızcasına, rəhmsizcəsinə, laqeydliklə, insafsızcasına, zalımcasına
**cold-bloodedness** ['kould'blʌdıdnıs] *n* soyuqqanlılıq; daşürəklilik, amansızlıq, rəhmsizlik; laqeydlik, insafsızlıq
**cold-hearted** ['kould'ha:tıd] *adj* daşürəkli, rəhmsiz; insafsız, vicdansız, mərhəmətsiz, sərt
**cold-heartedly** ['kould'ha:tıdlı] *adv* soyuqqanlılıqla, amansız/rəhmsiz bir tərzdə, insafsızcasına, mərhəmətsizcəsinə
**cold-heartedness** ['kould'ha:tıdnıs] *n* daşürəklilik, rəhmsizlik, mərhəmətsizlik, vicdansızlıq, soyuqqanlılıq
**coldish** ['kouldıʃ] *adj* soyuqtəhər, bir az soyuq; *Rather coldish to-day, isn't it? Bu gün bir az soyuqdur, elə deyilmi?*



**cold-livered** ['kould'lıvəd] *adj* 1. ehtirassız, soyuq, həvəssiz, şövqsüz; 2. təmkinli, soyuqqanlı, sakit
**coldly** ['kouldlı] *adv* 1. soyuq; *The wind blows coldly Soyuq külək əsir;* 2. quru, soyuq, qaşqabaqla; **to meet** *smb.* ~ bir kəsi quru / soyuq qarşılamaq; 3. səbirlə, təmkinlə; **to consider** ~ səbirlə / təmkinlə götür-qoy etmək
**coldness** ['kouldnıs] *n* 1. soyuq; 2. soyuqluq, quruluq, qaşqabaqlılıq; **the ~ of reception** qəbulun soyuqluğu
**cold-pig** ['kould'pıg] *v d.d.* yatanı oyatmaq üçün üstünə su tökmək yaxud yorğanını dartışdırmaq
**cold-shoulder** ['kould'ʃouldə'] *v* etina etməmək, saymamaq, məhəl qoymamaq; **to be ~ed** sayılmamaq, etinasızlıqla/ qaş-qabaqla qarşılanmaq
**coleseed** ['koulsi:d] *n bot.* turpəng, çölkələmi
**cole-slaw** ['koulslɔ:] *n amer.* xırda-xırda doğranmış kələm
**colewort** ['koulwə:t] *n bot.* yem kələmi
**colibri** ['kɔlıbri:] *n zool.* kolibri, milçəkquşu *(isti ölkələrdə yaşayan əlvan tüklü kiçik quş)*
**colic** ['kɔlık] *n* sancı, kəskin ağrı
**colitis** [kɔ'laıtıs] *n tib.* kolit *(yoğun bağırsağın iltihabı)*
**collaborate** [kə'læbəreıt] *v* 1. əməkdaşlıq etmək, bir yerdə işləmək; 2. düşmənlə əməkdaşlıq etmək/bir yerdə işləmək
**collaboration** [kəˌlæbə'reıʃn] *n* 1. əməkdaşlıq, əməkdaşlıq etmə; 2. düşmənlə əməkdaşlıq etmə, satqınlıq
**collaborator** [kə'læbəreıtə'] *n* 1. əməkdaş, iş yoldaşı; 2. kollaborasionist *(İkinci dünya müharibəsi zamanı öz vətənini işğal etmiş faşist işğalçıları ilə əməkdaşlıq edən vətən xaini)*
**collapse**[1] [kə'læps] *n* 1. uçqun; uçma, çökmə; tökülmə; yıxılma, düşmə; dağılma; süqut; **~ of a roof** damın uçması/dağılması; *The storm caused the collapse of the roof Tufan damın uçmasına/dağılmasına səbəb oldu;* **~ of the Soviet Union** Sovet İttifaqının dağılması/süqutu; *Collapse of the empire can't be prevented İmperiyanın dağılması labüddür / qarşısı alınmazdır;* 2. puça/boşa çıxma; iflasa/ müvəffəqiyyətsizliyə uğrama; **~ of plans** planların puça çıxması; **~ of hopes** ümidlərin boşa çıxması; **~ of negotiations** danışıqların boşa çıxması/iflasa uğraması; 3. iflas, iflas etmə/olma; **~ of a bank** bankın iflası; 4. *tex.* sıradan çıxma, xarab olma
**collapse**[2] [kə'læps] *v* 1. uçmaq, dağılmaq, tökülmək; uçurtmaq; *The weight of snow collapsed the roof Qarın ağırlığı damı uçurtdu; The tent collapsed Çadır uçdu/yıxıldı;* 2. əldən düşmək; bərk zəifləmək, xəstəlikdən üzülmək; 3. sərilmək; *He collapsed into his chair O, stoluna sərildi;* 4. ruhdan düşmək; 5. boşa / puça çıxmaq, baş tutmamaq, iflasa uğramaq *(plan, ümid, arzu və s. haq.)*; *Negotiations collapsed Danışıqlar baş tutmadı/iflasa uğradı;* 6. *tex.* sıradan çıxmaq, xarab olmaq;
◊ **to ~ with laughter** ≅ gülməkdən ölmək
**collapsible** [kə'læpsəbl] *adj* sökülən, sökülüb yığılan / quraşdırılan, bükülən, qatlanan, qatlama; açılan, qaldırılan; **~ boat** qatlanan/bükülən / sökülüb yığılan qayıq; **~ table** qatlanan / qatlama stol; **~ seat** açılan / qatlanan oturacaq
**collar**[1] [kɔlə'] *n* 1. yaxalıq, yaxa; **stand-up** ~ dik yaxalıq; 2. boyunbağı, həmail; **~ pearls** mirvari boyunbağı; 3. xalta; 4. xamıt *(at üçün qoşqu aləti)*; 5. *tex.* vtulka, oymaq *(çarxların içərisində sürtünməni azaltmaq üçün metal borucuq və halqa)*, halqa; 6. *tex.* flans *(dəmir boruları bir-birinə bənd etmək üçün onların uclarında olan yastı dairə)*;
◊ **white ~ unions** idarə işçilərinin / qulluqçuların həmkarlar ittifaqı; **to wear the ~** tabelikdə olmaq, boynuna xamıt keçirmək; **to slip the ~** xaltadan/boyunduruqdan azad olmaq; **in ~** işi olan; **out of ~** işsiz; **to work up to the ~** canbaşla/həvəslə/yorulmadan işləmək; **to fill** *one's* ~ öz vəzifəsini vicdanla yerinə yetirmək
**collar**[2] ['kɔlə'] *v* 1. yaxalıq geymək; xamıt / xalta taxmaq/keçirmək; 2. yaxalamaq, yaxasından yapışmaq; **to ~** *smb.* bir kəsi yaxalamaq, bir kəsin yaxasından yapışmaq; *She collared the boy in the hall O, oğlanı zalda yaxaladı;* 3. bürmələmək, bükmək, yumrulamaq *(əti və s.)*; 4. icazəsiz götürmək; *Did you collar my book? Sən / Siz mənim kitabımı icazəsiz götürmüsənmi / götürmüsünüzmü?*
**collar-bone** ['kɔləboun] *n anat.* körpücük sümüyü
**collate** [kɔ'leıt] *v* 1. müqayisə etmək, tutuşdurmaq, tutuşdurub yoxlamaq; **to ~ with the original** orijinalla müqayisə etmək / tutuşdurmaq; 2. *poliqr.* çap olunan kitabların vərəqlərini yoxlamaq
**collateral**[1] [kɔ'lætərəl] *n* 1. qohum; 2. əlavə təminat / təmin etmə
**collateral**[2] [kɔ'lætərəl] *adj* 1. əlavə, kənar, ikinci dərəcəli; **~ facts** *hüq.* ikinci dərəcəli faktlar / sübutlar; **~ evidence** *hüq.* bilvasitə dəlil / sübut; 2. paralel; **~ fibres** paralel liflər; 3. əlavə *(təminat və s. haq.)*; **~ loan** lombard borcu / krediti
**collation** [kɔ'leıʃn] *n* 1. müqayisə, tutuşdurma; tutuşdurulma, tutuşdurub yoxlama, tutuşdurulub yoxlanma; 2. çap olunan kitabın vərəqlərinin yoxlanılması; 3. yüngül qəlyanaltı; **cold ~** soyuq qəlyanaltı
**colleague** ['kɔli:g] *n* kolleqa *(peşə / sənət yoldaşı, həmkar)*, bir yerdə işləyən; *My esteemed colleague,... Mənim hörmətli kolleqam,...*
**collect**[1] ['kɔlekt] *n kils.* qısa ibadət
**collect**[2] [kə'lekt] *v* 1. yığmaq, toplamaq, bir yerə yığmaq/toplamaq; **to ~ pupils in the hall** şagirdləri zala toplamaq/yığmaq; **to ~ information** məlumat toplamaq; **to ~ signatures** imza toplamaq; 2. toplaşmaq, toplanmaq, bir yerə yığışmaq; *A crowd soon collected Tezliklə ca-*

*maat toplaşdı; Water collects in hollows Su çuxurlara yığılır;* 3. yığmaq, kolleksiya toplamaq; **to ~ stamps/books/pictures** marka/kitab/şəkil yığmaq; 4. yığmaq *(ianə);* 5. almaq, yığmaq, toplamaq *(vergi, rüsum, gömrük və s.);* 6. *mal.* inkasso etmək *(ödənilmək üçün sənəd təqdim etmək və sənədlər üzrə pul almaq);* 7. götürmək, almaq; **to ~ goods from the station** malı vağzaldan almaq/götürmək; 8. diqqətini/fikrini toplamaq/cəmləşdirmək; **to ~ oneself** özünü ələ almaq, özünə gəlmək, ağlını başına yığmaq; **to ~ *one's* thoughts/energies** fikrini/gücünü toplamaq; **to ~ *one's* courage** cəsarətini toplamaq; 9. *arx.* nəticə çıxarmaq, deyiləndən nəticəyə gəlmək

**collected** [kə'lektıd] *adj* 1. seçilmiş; **~ edition / works** seçilmiş əsərlər *(bir müəllifin);* 2. təmkinli, səbirli, özünü saxlaya bilən; ehtiyatlı; sakit; *He was calm and collected O, sakit və təmkinli idi*

**collection** [kə'lekʃn] *n* 1. toplu, külliyyat; **~ of stories** hekayələr toplusu; 2. yığma; toplama; yığılma, toplanma; **~s of letters** məktubları yığma/toplama *(poçt qutusundan); What time's the next collection? Məktubların növbəti yığımı nə vaxtdır?* **~ of facts** dəlillərin toplanması / yığılması; 3. pul ianəsi yığma *(xüs. kilsədə);* **to make /to take up a ~** ianə toplamaq; **~s for refugees** qaçqınlar üçün pul ianəsi toplama; 4. pul yığma/toplama; **~ of taxes** vergi toplama/yığma; 5. *mal.* inkasso *(sənədlər və ya veksel üzrə pul toplama);* 6. kolleksiya *(elmi, bədii və tarixi əhəmiyyəti olan şeylərin müəyyən sistem üzrə toplanması);* **~ of books/ plants / stamps** kitabların/ bitkilərin / markaların kolleksiyası; **to make a ~** kolleksiya düzəltmək /tərtib etmək; *Tom has a very good collection of foreign coins Tomun xarici sikkələrdən ibarət yaxşı bir kolleksiyası var;* 7. yığışma, toplaşma, yığılma, toplanma; bir yerə toplanmış çoxlu adam; **~ of people** izdiham; 8. yığın, topa, qalaq; **~ of rubbish** zibil topası/ qalağı; *There was a collection of dust in the corner Küncdə bir qalaq toz vardı*

**collective**[1] [kə'lektıv] *n* 1. kollektiv; *The workers' collective won't like the new industrial plan Fəhlə kollektivi yeni sənaye planını bəyənmir;* 2. *qram.* kollektiv isim *(müəyyən qrup bildirən isim); Committee and flock are collectives Committee və flock kollektiv isimlərdir*

**collective**[2] [kə'lektıv] *adj* 1. kollektiv; ümumi, ellik, birgə; müştərək; **~ leadership** kollegial rəhbərlik; **~ ownership of land** torpaq üzərində ümumi sahiblik; **~ petition** birgə / kollektiv ərizə; **~ agreement** kollektiv müqavilə; **~ security** kollektiv təhlükəsizlik; **~ interests of a community** cəmiyyətin ümumi maraqları; **the ~ body of the university** universitetin kollektivi; *It is the collective opinion of the government of Western Europe that peace is always better than war Qərbi Avropa dövlətlərinin ümumi fikri belədir ki, sülh müharibədən daha yaxşıdır;* 2.*qram.* kollektiv; **~ nouns** kollektiv isimlər

**collective-farm** [kə'lektıv'fa:m] *n* kolxoz

**collective-farmer** [kə'lektıv'fa:mə<sup></sup>] *n* kolxozçu

**collective-fruit** [kə'lektıv'fru:t] *n* *bot.* hamaş meyvə

**collectively** [kə'lektıvlı] *adv* kollektiv surətdə, elliklə, birgə, bir yerdə, bərabər; **to work ~** birgə / bir yerdə işləmək

**collectivism** [kə'lektıvızm] *n* kollektivizm

**collectivity** [ˌkolek'tıvıtı] *n* 1. ümumilik, bərabərlik; **~ of effort** cəhd / səy birliyi; 2. kollektiv; 3. birgə sahib olma; **~ of the soil** torpağa birgə sahib olma

**collectivization, -isation** [kəˌlektıvaı'zeıʃn] *n* kollektivləşdirmə, kollektivləşmə

**collectivize, -ise** [kə'lektıvaız] *n* kollektivləşdirmək

**collectivized, -ised** [kə'lektıvaızd] *adj* kollektivləşdirilmiş; **~ industry** kollektivləşdirilmiş sənaye

**collector** [kə'lektə<sup></sup>] *n* 1. toplayıcı, toplayan, məcmuə tərtibçisi; 2. kolleksiyaçı, kolleksiya toplayan; 3. toplayan, yığan *(vergi və s.);* 4. kontroller *(bilet yoxlayan);* 5. *mal.* inkassator *(əsasən idarə xaricində pul yığmaq və pul verməklə məşğul olan kassir);* 6. *tex.* kollektor *(1) mayeləri və qazları toplayıb aparan kanal ya boru; 2) avtomobillərdə dəyişən elektrik cərəyanını daimi cərəyana çevirən silindr)*

**college**[1] ['kɔlıdʒ] *n* 1. kollec; 2. xüsusi ali məktəb *(hərbi, kənd təsərrüfatı, dənizçilik və s. sahələr üzrə);* **medical ~** tibb kolleci; **teachers' training ~** pedaqoji kollec, müəllim hazırlayan kollec; 3. *amer.* universitet; 4. korporasiya *(bir peşəyə, silkə və s. mənsub adamların ittifaqı / cəmiyyəti / birləşməsi);* kollegiya; **C. of Surgeons** Cərrahlar kollegiyası; 5. ianə ilə yaşayan xeyriyyəçilik müəssisəsi; 6. *jarq.* həbsxana; 7. *tar.* mömin adamların ianə ilə dolanan cəmiyyəti

**college**[2] ['kɔlıdʒ] *adj: He is a college man O, universitet təhsili alıbdır*

**collegian** [kə'li:dʒjən] *n* 1. kollec tələbəsi; kollec təhsili almış, universiteti qurtarmış, universitet təhsilli; 2. *jarq.* dustaq

**collegiate** [kə'lı:dʒııt] *adj* 1. universitet; **~ life** universitet həyatı; 2. kollegial

**collide** [kə'laıd] *v* toqquşmaq; *The motor cars collided Avtomobillər toqquşdular; Our interests collided Bizim maraqlarımız toqquşdu; The government collided with Parliament over its industrial plans Dövlət özünün sənaye planlarına görə Parlamentlə toqquşdu / razılığa gəlmədi*

**collier** ['kɔlıə<sup></sup>] *n* 1. mədən fəhləsi, şaxtaçı, kömürçıxaran; 2. *dən.* kömürçü, ocaqçı *(gəmidə);* 3. kömür daşıyan gəmi



**colliery** ['kɔljərı] *n* 1. şaxta, kömür mədəni; 2. kömür sənayesi müəssisəsi

**colligate** ['kɔlıgeıt] *v* *mənt.* əlaqələndirmək, ümumiləşdirmək *(sübutları, faktları)*

**colligation** [ˌkɔlı'geıʃn] *n* *mənt.* əlaqələndirmə, ümumiləşdirmə *(sübutları, faktları)*

**collision** [kə'lıʒn] *n* toqquşma; **~ of trains / ships** qatarların/gəmilərin toqquşması; **to come in/into ~** toqquşmaq, bir-birinə dəymək; **the ~ of interests** maraqların toqquşması; *A collision with Parliament could ruin the government's plans Parlamentlə toqquşma dövlətin planlarını boşa çıxara bilərdi*

**collocate** ['kɔləkeıt] *v* 1. yerləşdirmək, yerbəyer etmək *(kitabları və s.);* 2. uzlaşmaq, əlaqəyə girə bilmək; *The words **strong** and **coffee** collocate: **Tünd** sözü ilə **kofe** sözü əlaqəyə girə bilir:* **strong coffee** tünd qəhvə

**collocation** [ˌkɔlə'keıʃn] *n* 1. yerləşmə, yerləşdirmə; düzülmə; düzülüş, sahman; yerbəyer etmə; 2. *dilç.* söz birləşməsi, sözlərin birləşməsi; **dictionary of ~s** frazeoloji birləşmələr lüğəti; 3. əlaqəyə girmə; *Strong coffee is an English collocation but "powerful coffee" is not Strong coffee ingilis dilində düzgün söz birləşməsidir, lakin "powerful coffee" yox (yəni ingiliscə belə birləşmə mümkün deyil)*

**collodion** [kə'loudjən] *n* kollodium *(tibb və fotoqrafiyada işlənən qatı, efirli məhlul)*

**colloquial** [kə'lokwıəl] *adj* danışıq *(söz, ifadə, üslub və s. haq.);* danışıqda çox / tez-tez işlənən *(söz və s. haq.)*

**colloquialism** [kə'loukwıəlızm] *n* danışıq dilində / danışıqda çox işlənən söz və ya ifadələr

**colloquist** ['kɔloukwıst] *n* həmsöhbət, müsahib, söhbət yoldaşı

**colloquium** [kə'loukwıəm] *n (pl* **-quia**) kollokvium *(biliyi yoxlamaq məqsədilə tələbə ilə edilən söhbət);* **to hold colloquia** kollokvium keçirmək

**colloquy** ['kɔləkwı] *n* 1. rəsmi söhbət; müzakirə; konfrans; 2. yazılı şəkildə mükalimə/dialoq; 3. *amer.* bir-birinə replika atma

**collude** [kə'lu:d] *v* *arx.* gizli sövdələşmək / razılaşmaq/sözləşmək / şərtləşmək; dilbir olmaq; qəsddə iştirak etmək

**collusion** [kə'lu:ʒn] *n* 1. gizli razılaşma / dilbir olma; 2. *hüq.* iddiaçı ilə cavabdeh arasında gizli sövdələşmə / razılaşma

**collusive** [kə'lu:sıv] *adj* 1. gizli olaraq təşkil edilmiş, gizli razılıq ilə; **~ treaty with the enemy** düşmənlə gizli sövdələşmə / razılaşma; 2. sövdələşmədə iştirak edən, dilbir olan

**Colombian**[1] [kə'lɔmbıən] *n* kolumbiyalı

**Colombian**[2] [kə'lɔmbıən] *adj* Kolumbiya

**colon** ['koulən] *n* I *anat.* yoğun bağırsaq

**colon** ['koulən] *n* II iki nöqtə

**colonel** ['kə:nl] *n* polkovnik

**colonelcy** ['kə:nlsı] *n* polkovnik rütbəsi

**colonial**[1] [kə'lounjəl] *n* 1. müstəmləkə sakini / əhalisi; 2. *tar.* müstəqillik uğrunda mübarizə dövründə Amerika ordusunun əsgəri

**colonial**[2] [kə'lounjəl] *adj* müstəmləkə; **~ system** müstəmləkə sistemi; **~ rule** müstəmləkə ağalığı/hökmranlığı; **~ countries /nations** koloniya ölkələri/xalqları; **Colonial Office** koloniya nazirliyi *(İngiltərədə)*

**colonialism** [kə'lounjəlızm] *n* kolonializm, müstəmləkəçilik; **complete collapse of ~** müstəmləkəçiliyin / kolonializmin tam dağılması; **to abolish / to destroy ~** kolonializmi / müstəmləkəçiliyi ləğv etmək

**colonist** ['kɔlənıst] *n* kolonist, koloniyada yaşayan; ilk mühacir

**colonitis** [ˌkɔlə'naıtıs] *n* *tib.* yoğun bağırsağın iltihabı

**colonization, -isation** [ˌkɔlənaı'zeıʃən] *n* müstəmləkələşmə, müstəmləkələşdirmə, müstəmləkəyə çevirmə

**colonize, -ise** ['kɔlənaız] *v* 1. müstəmləkələşdirmək, müstəmləkəyə çevirmək; 2. məskun etmək, məskunlaşdırmaq *(boş yerlərə əhali köçürüb yerləşdirmək)*

**colonizer, -iser** ['kɔlənaızə<sup></sup>] *v* 1. müstəmləkəçi; 2. kolonist, koloniyada yaşayan

**colony** ['kɔlənı] *n* 1. müstəmləkə; 2. koloniya *(başqa bir ölkədə və ya şəhərdə yaşayan həmyerlilərin məkanı);* 3. koloniya *(hər hansı bir məqsədlə bir yerdə yaşamaq üçün köçürülmüş adamların yaşadığı yer/məkan);* **the first Anglo-Saxon colonies in Britain** Britaniyada Anqlo-Saksonların ilk koloniyaları; 4. qəsəbə; **~ of artists** rəssamların qəsəbəsi; **summer ~** *amer.* yaylaq qəsəbəsi; 5. koloniya *(xüsusi məqsədlə qulluq edən müəssisə);* **penal /labour ~** islahedici əmək koloniyası *(dustaqlar və s. üçün);* 6. ailə, fəsilə *(arı, qarışqa və s. haq.)*

**colophony** [kə'lɔfənı] *n* kanifol *(iynəyarpaqlı ağacların şirəsindən hasil edilən bərk qatran)*

**color** ['kʌlə<sup></sup>] *n* *amer.* = **colour**[1]

**Colorado beetle** [ˌkɔlə'ra:dou'bi:tl] *n* Kolorado böcəyi *(kartof böcəyi)*

**coloration** [ˌkʌlə'reıʃn] *n* 1. rəngləmə, boyama; rənglənmə, boyanma; ton, çalar; 2. əlvan bəzəmə/bəzənmə; bəzəmə, bəzənmə

**coloratura** [ˌkɔlərə'tuərə] *n* *mus.* koloratura

**colorific** [ˌkɔlə'rıfık] *adj* 1. boyayıcı; boyayan, boyaqçı; 2. parlaq, gözəl, canlı, aydın *(üslub haq.);* 3. əlvan, rəngbərəng

**colorimeter** [ˌkʌlə'rımıtə<sup></sup>] *n* kolorimetr *(rəngli məhlulun konsentrasiya miqdarını təyin edən cihaz)*

**colossal** [kə'lɔsl] *adj* 1.nəhəng, çox iri, çox böyük, azman, əzəmətli; **a ~ building** nəhəng / çox iri / əzəmətli bina; 2. heyranedici, valehedici; fövqəladə; ağla gəlməyən /sığmayan, inanılmaz; son dərəcə; cəlallı, dəbdəbəli, təmtə-

raqlı, çox gözəl; ~ **stupidity** inanılmaz/ağlasığmaz / ağlagəlməz axmaqlıq

**colossally** [kə'lɔsəlı] *adv* həddən artıq, çox; *That was colossally interesting O çox maraqlı idi*

**colour¹** ['kʌlə<sup></sup>] *n* **1.** rəng; **primary / fundamental/simple** ~**s** əsas rənglər; **secondary** ~**s** qatışıq rənglər; **complimentary** ~ əlavə rəng; **bright /dark/dull/faded** ~**s** əlvan/tünd /tutqun /solmuş rənglər; **all** ~**s of the rainbow** göy qurşağının bütün rəngləri; **without** ~ rəngsiz; **to dress in** ~**s** al-əlvan geymək; *This material is light / dark in colour Bu material açıq / tünd rəngdədir;* **to match** ~**s** rəng seçmək; **2.** boya, boyaq, rəng; boyaq maddəsi; piqment *(heyvan və bitki orqanizmində toxumalara rəng verən maddə);* **to mix** ~**s** boyaları / rəngləri qarışdırmaq; **to lay on the** ~**s too thickly** *məc* həddən artıq şişirtmək, mübaliğə etmək, ifrata varmaq; **3.** üzün rəngi; allıq, qızartı; *She has very little colour O çox solğundur; She has a fresh colour Onun sifətinin rəngi sağlamdır;* **to lose** ~ solmaq, rəngi/bənizi qaçmaq, ağarmaq; **to gain** ~ qızarmaq, qıpqırmızı olmaq; **to change** ~ üzünün rəngi dəyişmək *(solmaq, ya da qızarmaq);* **4.** çalar, çalarlıq, rəngə çalma, ton; *His argument has the colour of reason Onun dəlilində bir həqiqət çaları var;* **to give some** ~ **of truth to** *smth.* bir şeyə həqiqət çaları vermək; **5.** kolorit *(səciyyəvi xüsusiyyət);* **local** ~ yerli kolorit; **to show** *one's* **true** ~ olduğu kimi görünmək, maskasını çıxarmaq/atmaq; **to paint** *smth.* **in bright** ~**s** bir şeyi aydın / doğru / düzgün təsvir etmək; **to give a false** ~ **to** *smth.* bir şeyi yanlış tərzdə təqdim etmək; **to see things in their true** ~ şeyləri olduğu kimi görmək; **6.** bədiilik; aydınlıq, açıqlıq; canlılıq; *There is colour in his writing Onun yazılarında / əsərlərində bədiilik var;* **7.** *mus.* tembr *(hər bir musiqi aləti və ya səs üçün xarakterik olan xüsusiyyət),* çalar; **8.** bəhanə; **under the** ~ **of friendship** dostluq bəhanəsi ilə;

◊ **off** ~ **1)** xəstə görkəmi olma; **2)** pis əhvali-ruhiyyədə / kefsiz olma; **3)** ədəbsiz, nalayiq, yaramaz, ləyaqətsiz *(lətifə, hekayə və s. haq.);* **4)** şübhəli, şübhə doğuran; **5)** keyfiyyətsiz, kafi olmayan, kifayət etməyən, qeyri-qənaətbəxş, qeyri-kafi; **without** ~ açıq, aşkar, aydın; **to see the** ~ **of** *smb.'s* **money** *kin.* **1)** bir kəsdən pul almaq; **2)** bir kəsdə pul olub-olmadığına əmin olmaq; **to take** *one's* ~ **from** *smb.* bir kəsdən nümunə götürmək; bir kəsi yamsılamaq, özünü bir kəsə bənzətmək/oxşatmaq; *Blind man can judge no colours ≅ Kor adam hər şeyi qara görür*

**colour²** ['kʌlə<sup></sup>] *v* **1.** rəngləmək; boyamaq *(xüs. karandaşla); The child is colouring the picture Uşaq şəkli rəngləyir;* **2.** rənglənmək, boyanmaq; *The leaves have already started to colour; it will soon be winter Artıq yarpaqlar rəngini dəyişməyə / saralmağa başlayıb; tezliklə qış gələcək;* **3.** iz buraxmaq; *His experience has coloured his views Onun həyat təcrübəsi həyata baxışlarına təsir edib;* **4.** artırmaq, üstünə qoymaq, mübaliğə etmək, təhrif etmək, mənasını dəyişdirmək; **5.** qızarmaq; *As soon as he started to argue, he coloured quickly O, mübahisə etməyə başlayan kimi qızardı*

**colourable** ['kʌlərəbl] *adj* **1.** rəng/boya götürən; **2.** uğurlu; yaxşı; ~ **imitation** yaxşı təqlid; **3.** saxta, uydurma, yalan; gizli, yalançı, riyakar, ikiüzlü

**colour-blind** ['kʌləblaınd] *adj tib.* rəngləri fərqləndirməyən, daltonizm xəstəliyinə tutulmuş

**colour-blindness** ['kʌlə.blaındnıs] *n tib.* rəngləri fərqləndirə bilməmə; daltonizm *(gözün bəzi rəngləri seçə bilməməsi)*

**colour-book** ['kʌləbuk] *n* rəngli şəkilləri olan kitab

**colourcast** ['kʌləka:st] *n* rəngli televiziya verilişi

**colour-cinematography**['kʌlə.sınımə'tɔgrəfı] *n* rəngli kino

**coloured** ['kʌləd] *adj* **1.** boyanmış, rənglənmiş; əlvan; bəzənmiş; **2.** əlvan; rəngli; ~ **shirt** əlvan köynək; ~ **ink** rəngli mürəkkəb; ~ **photograph** rəngli fotoşəkil; **3.** rəngli *(zəncilər, mulatlar haq.);* ~ **people** *amer.* zəncilər, mulatlar; **4.** *amer.* şişirdilmiş, təhrif olunmuş / edilmiş

**colour film** ['kʌlə'fılm] *n* rəngli film

**colourful** ['kʌləfl] *adj* rəngli, əlvan, al-əlvan, rəngbərəng

**colouring** ['kʌlərıŋ] *n* **1.** boyaq maddəsi; **2.** boya *(rəssamların istifadə etdiyi);* **3.** rəng seçmə hissiyyatı *(rəssamlarda);* **4.** kolorit *(rəssamlıqda boyaların uyğunluğu);* **5.** rəng *(sifətin, saçın və s.); People always think I'm ill because of my colouring Sifətimin rənginə görə camaat həmişə elə bilir ki, mən xəstəyəm;* **6.** şişirtmə, bəzəmə; **to tell a story without** ~ əhvalatı şişirtmədən/olduğu kimi danışmaq; *I told the story without colouring Mən əhvalatı şişirtmədən /olduğu kimi danışdım*

**colorless** ['kʌləlıs] *adj amer.* = **colourless**

**colourless** ['kʌləlıs] *adj* **1.** rəngsiz, şəffaf; **a** ~ **liquid** şəffaf/rəngsiz maye; *Water is colourless Su rəngsizdir/şəffafdır;* **2.** solğun, rəngi qaçmış; *He was so colourless we thought he was ill Onun rəngi elə qaçmışdı ki, biz fikirləşdik ki, o, xəstədir;* **3.** sönük, maraqsız, ifadəsiz, təsirsiz; **a** ~ **speech** sönük / maraqsız nitq; *His speech was very colourless Onun nitqi çox sönük/maraqsız idi;* **4.** laqeyd, adamayovuşmaz, qarayaqovuşmaz *(adam haq.),* maraqsız, adi *(yaşayış haq.); John's wife is one of the most colourless people I've ever met Conun arvadı mənim gördüyüm adamlar içərisində ən qarayaqovuşmaz adamdır;* **a** ~ **existence** adi/maraqsız həyat

**colourlessly** ['kʌləlıslı] *adv* maraqsız, sönük, ifadəsiz; maraqsız / sönük / ifadəsiz bir tərzdə



**colourlessness** ['kʌləlısnıs] *n* **1.** şəffaflıq; rəngsizlik, solğunluq; **2.** sönüklük, ifadəsizlik, maraqsızlıq, təsirsizlik

**colours** ['kʌləz] *n (felin cəm forması ilə işlənir)* **1.** *hərb.* bayraq *(ölkənin, gəminin, ordu bölməsinin və s. rəsmi bayrağı);* **regimental** ~ alay bayrağı; **enemy** ~ düşmən bayrağı; *The general was proud that his men had taken the enemy colours in battle General fəxr edirdi ki, onun əsgərləri döyüşdə düşmən bayrağını ələ keçiriblər;* **to sail under false** ~ *dən.* başqasının bayrağı altında üzmək *(gəmi haq.);* **the** ~ hərbi xidmət; **to join the** ~ hərbi xidmətə başlamaq; **to be with the** ~ hərbi xidmətdə olmaq; **to desert the** ~ fərarilik etmək, hərbi xidmətdən boyun qaçırmaq; **to call to the** ~ səfərbərliyə almaq, orduya çağırmaq; **2.** nişan, emblem, rəmz *(komandanın, məktəbin, klubun və s.);*

◊ **to nail** *one's* ~ **to the mast** öz inamını açıq-açığına müdafiə etmək, öz fikrində möhkəm olmaq; **to lower/to strike** *one's* ~ təslim olmaq, özünü məğlub hesab etmək; **to stick to** *one's* ~ mövqeyini vermək, öz dediyinin üstündə möhkəm dayanmaq, sona qədər öz inamına sadiq qalmaq; **to sail under false** ~ **1)** əsl adını gizləmək; **2)** maskalanmaq, əsl məramını/məqsədini gizlətmək; **to wear** *smb.'s* ~ bir kəsin tərəfində olmaq; bir kəsi müdafiə etmək, bir kəsə kömək göstərmək; **to come off with flying** ~ qalib gəlmək, qələbə çalmaq, müvəffəqiyyət qazanmaq; **to pass an examination with flying** ~ imtahanı çox gözəl vermək

**colour-wash¹** ['kʌlə'wɔʃ] *n* yapışqanlı boya

**colour-wash²** ['kʌlə'wɔʃ] *v* yapışqanlı boya ilə rəngləmək

**colporteur** ['kɔl.pɔ:tə<sup></sup>] *n* paylayan *(qəzet və s.);* küçədə ucuz kitablar satan *(İngiltərədə)*

**colt** [koult] *n* **1.** qulan; qoduq, xotuq *(eşşək balası),* dəvə balası, köşək *(4 yaşına qədər);* **2.** *dən.* ip *(gəmidə);*

◊ **to cast** *one's* ~**'s teeth** ciddiləşmək, ağıllanmaq, ağırlaşmaq

**coltish** ['koultıʃ] *adj* oynaq, oynayan, şux, şən, işvəli, şivəli

**coltishly** ['koultıʃlı] *adv* oynaq, şux, şən; işvəli / şivəli bir tərzdə

**coltishness** ['koultıʃnıs] *n* oynaqlıq, şuxluq; işvəlilik

**coltsfoot** ['koultsfut] *n bot.* dəvədabanı

**colt's tail** ['koultsteıl] *n bot.* qatırquyruğu *(bitki)*

**columbaria** [.kɔləm'bεərıə] *n* **columbarium** *isminin cəm forması*

**columbarium** [.kɔləm'bεərıəm] *n (pl* **-ria***)* **1.** göyərçin əti; **2.** kolumbari *(krematoriyada yandırılmış meyitin külü olan qabların saxlandığı yer)*

**columbary** ['kɔləmbərı] *n* göyərçin əti

**column** ['kɔləm] *n* **1.** *mem.* sütun; **2.** sütun; ~ **of smoke** tüstü sütunu; ~ **of mercury** civə sütunu *(termometrdə);* **newspaper** ~ qəzet sütunu; **the spinal** ~ *anat.* bel sütunu/sümüyü, onurğa; ~ **of figures** rəqəmlərin sütunu; **3.** *amer.* felyeton

**columnist** ['kɔləmnıst] *n amer.* felyetonçu, felyeton yazan

**colutea** [kə'lju:tıə] *n bot.* qabarıq paxla *(bitki);* qonur yosun

**colza** ['kɔlzə] *n bot.* **1.** turpəng *(bitki);* **2.** raps *(toxumundan yağ alınan ot)*

**colza-oil** ['kɔlzə'ɔıl] *n* turpəng / raps yağı

**coma** ['koumə] *n* I *tib.* koma *(müxtəlif zədə və ya xəstəlik nəticəsində baş verən yuxuya bənzər ağır hal),* koma vəziyyəti, huşunu itirmə; **to go into a** ~ koma vəziyyətinə düşmək; *After she drank the poison, she went into a coma Zəhər içdikdən sonra o, koma vəziyyətinə düşdü*

**coma** ['koumə] *n* II **1.** *(pl* **-ae***)* kəkil *(bitki toxumunda və ya yarpağında əmələ gələn);* **2.** çətir *(ağaclarda);* **3.** *astr.* pərdə, örtük *(kometalarda)*

**comae** ['koumi:] **coma** II *isminin cəm forması*

**comarum** ['kɔmərəm] *n bot.* gördəvər

**co-mate** ['kou'meıt] *n* məsləkdaş, yoldaş, şərik, ortaq

**comatose** ['koumətous] *adj tib.* **1.** komatoz, komalı, koma vəziyyətində olan; tam huşsuz; *Is the poisoned girl conscious or comatose? Zəhərlənmiş qızın huşu başındadır, yoxsa koma vəziyyətindədir?* **2.** komayaoxşar, komayabənzər; **a deep** ~ **sleep** komayabənzər dərin yuxu; **3.** süst və yuxulu; **to be a bit** ~ **after dinner** nahardan sonra bir az süst və yuxulu vəziyyətdə olmaq

**comb¹** [koum] *n* **1.** daraq; **2.** qaşov; **3.** *toxuc.* daraq *(yun və s. daramaq üçün);* **4.** pipik *(xoruzda),* kəkil *(quşlarda);* **5.** damda at başı şəklində bəzək; **6.** şan, arı şanı

**comb²** [koum] *adj* şan; ~ **honey** şan balı

**comb³** [koum] *v* **1.** daramaq; **to** ~ *one's* **hair** saçını daramaq; *If you combed your hair often, you wouldn't look so untidy Əgər saçını/saçınızı tez-tez darasaydın/darasaydınız belə səliqəsiz görünməzdin/görünməzdiniz;* **2.** qaşovlamaq; **to** ~ **a horse** atı qaşovlamaq; **3.** daramaq *(yunu və s.);* **to** ~ **wool** yun daramaq; **to** ~ **flax** kətan daramaq; **4.** *hərb.* araq-varaq etmək; *The police combed the woods for the missing boy Polis itmiş oğlanı tapmaq məqsədilə meşəni araq-varaq etdi;* **5.** dağılmaq, parçalanmaq *(dalğa haq.); The waves combed over the vessel Dalğalar gəmiyə dəyib dağılırdı;* **6.** *d.d.* danlamaq, söymək; **to** ~ **out 1)** daramaq; qaşımaq, qaşıyıb qoparmaq; **2)** təmizləmək, təmizlik işi aparmaq *(müəssisədə və s.);*

◊ **to** ~ *smb.'s* **hair the wrong way** bir kəsin əksinə çıxmaq/ziddinə danışmaq; **to** ~ *smb.'s* **hair for him** ≅ bir kəsə qulaqburması vermək, bir kəsi bərk məzəmmət etmək

**combat¹** ['kɔmbət] *n* **1.** döyüş, dava, vuruş, müharibə; **single** ~ təkbətək vuruş/döyüş; **2.**

mübarizə; **continuous** ~ arasıkəsilməyən mübarizə; *The combat between good and evil will continue for ever Xeyirlə şər arasında mübarizə əbədi olaraq davam edəcək*

**combat**[2] [ˈkɔmbət] *adj* hərbi; ~ **operations** hərbi əməliyyatlar; ~ **action** *amer.* hərbi əməliyyat, döyüş, vuruş; ~ **aviation** hərbi aviasiya; ~ **area** 1) hərbi əməliyyat rayonu; 2) müdafiə / hücum zolağı; ~ **order** *hərb.* 1) hərbi əmr; 2) hərbi qayda-qanun; ~ **zone** cəbhə zonası

**combat**[3] [ˈkɔmbət] *v* (**-tt-**) mübarizə aparmaq/etmək; döyüşmək, vuruşmaq; **to ~ unemployment** işsizliyə qarşı mübarizə aparmaq; *We must combat the enemy everywhere until victory is ours Qələbə bizim olana qədər biz hər yerdə düşmənə qarşı mübarizə aparmalıyıq; The ship combatted with the wind and waves Gəmi küləklə və dalğalarla döyüşürdü / vuruşurdu*

**combatant**[1] [ˈkɔmbətənt] *n* **1**. vuruşan, döyüşən, çarpışan; *In the last war as many non-combatants as combatants were killed Son müharibədə həm bilvasitə, həm də bilavasitə iştirakçılar öldürüldü;* **2**. döyüşən/vuruşan tərəflər; **3**. *hərb.* hərbi vəsait

**combatant**[2] [ˈkɔmbətənt] *adj* hərbi, nizami; ~ **forces** hərbi qüvvələr; ~ **officer** nizami zabit; ~ **suit** *amer.* hərbi geyim; ~ **ships** hərbi gəmilər; *The Irish government refused to allow combatant ships to enter its ports İrlandiya hökuməti hərbi gəmilərin onun limanına daxil olmasına icazə vermədi*

**combative** [ˈkɔmbətıv] *adj* hərbi; davakar, mübariz, cəngavər; *He is combative by nature O təbiətən davakardır/mübarizdir*

**combatively** [ˈkɔmbətıvlı] *adv* mübarizcəsinə, davakarlıqla; mübariz / davakar bir tərzdə

**combat-ready** [ˈkɔmbətˈredı] *adj* hücuma hazır; ~ **rocket** hücuma/buraxılmağa hazır raket

**comber** [ˈkouməʳ] *n* I *toxuc.* darayıcı, darayan fəhlə / maşın

**comber** [ˈkouməʳ] *n* II mavi suda uzun qıvrılan dalğa

**combination** [ˌkɔmbıˈneıʃn] *n* **1**. birləşmə, kombinasiya *(birləşdirmə, uyğunlaşdırma, quraşdırma);* **in ~** birləşmədə, əlaqədə; **phraseological ~** *dilç.* frazeoloji birləşmə; **2**. ittifaq, cəmiyyət; güruh, banda, dəstə; **3**. *pl* kombinasiya *(alt qadın paltarı);* **4**. kolyaskası olan motosiklet; **5**. *kim.* birləşmə; *Water is a combination of hydrogen and oxygen Su hidrogen və oksigenin birləşməsindən ibarətdir*

**combination-room** [ˌkɔmbıˈneıʃnru:m] *n* Kembric universitetində professorlar üçün otaq

**combinative** [ˈkɔmbınətıv] *adj* birləşdirilmiş, kombinə edilmiş, kombinasiya

**combinatorial** [kəmˌbaınəˈtɔ:rıəl] *adj riyaz.* kombinasiya; ~ **analysis** kombinasiya analizi

**combine**[1] [ˈkɔmbaın] *n amer. d.d.* **1**. kartel *(iri kapitalist sənayesinin inhisarçı birləşməsi)*, sindikat *(satış bazarlarına hakim olmaq və ifrat mənfəət götürmək üçün sahibkarların inhisarçı birləşmə formalarından biri)*, birləşmə, birlik, ittifaq, təşkilat; **political ~** siyasi ittifaq/birlik; **commercial ~** ticarət birliyi/təşkilatı; **2**. *k.t.* kombayn; **3**. mexanizmlərin birləşməsi *(ümumi işi yerinə yetirmək üçün)*

**combine**[2] [kəmˈbaın] *v* **1**. birləşdirmək; **to ~ forces/efforts** qüvvələri/səyləri birləşdirmək; **2**. (**together, with**) birləşmək; *The two countries combined together against their enemy Bu iki ölkə düşmənlərinə qarşı birləşdilər; What chemicals combine together to make water? Su əmələ gətirmək üçün hansı kimyəvi elementlər birləşir?* **3**. kombayn vasitəsi ilə yığmaq *(məhsulu)*

**combined** [kəmˈbaınd] *adj* kombinasiya edilmiş; birləşdirilmiş, uyğunlaşdırılmış, quraşdırılmış; ~ **efforts** birləşdirilmiş səylər / cəhdlər; ~ **drill** *k.t.* kombinasiya edilmiş toxumsəpən maşın; ◊ ~ **arms operation** *hərb.* ümumqoşun əməliyyatı

**combing** [ˈkoumıŋ] *n* **1**. darama; daranma; **2**. daranmadan sonra daraqda qalan saç; **3**. diqqətlə yoxlama *(ərazini);* **4**. təmizləmə *(müəssisəni və s.)*

**combing-machine** [ˈkoumıŋməˌʃi:n] *n toxuc.* daraqlı maşın, yunatan maşın

**comb-out**[1] [ˈkoumˈaut] *n* **1**. darama, darayıb təmizləmə; daranma, daranıb təmizlənmə; *Her hair needs a good comb-out Onun saçı yaxşı-yaxşı daranmalıdır, Onun saçını yaxşı-yaxşı daramaq lazımdır;* **2**. təmizləmə *(partiyada, həmkarlar ittifaqında və s.); The government hopes to save money by the latest comb-out of government officials Məmurlarını axırıncı dəfə ixtisara salmaqla hökumət pula qənaət edəcəyinə ümid bəsləyir*

**comb-out**[2] [ˈkoumˈaut] *v* **1**. daramaq, darayıb təmizləmək; *Comb out the tangles Dolaşığı dara / darayın;* **2**. təmizləmək *(təşkilatı, müəssisəni artıq adamlardan); The government hopes to cut costs by combing-out unnecessary officials from the armed forces Dövlət silahlı qüvvələrdən artıq (lazımsız) qulluqçuları təmizləməklə xərcləri azaltmağa ümid edir;* **3**. axtarmaq; *The student spent many hours in the library combing out the facts he wanted Lazım olan faktları axtarmaq üçün tələbə kitabxanada saatlarla vaxt itirdi*

**combustible**[1] [kəmˈbʌstəbl] *n* tezalışan / tezalovlanan maddə

**combustible**[2] [kəmˈbʌstəbl] *adj* yanan, tezalovlanan, asanlıqlayanan; ~ **mixture** tezyanan / tezalovlanan qatışıq; *Petrol is highly combustible so don't smoke here Benzin / Petrol tezalışandır/tezalovlanandır, burada siqaret çəkmə/ çəkməyin*



**combustion** [kəmˈbʌstʃn] *n* **1**. yanma; alovlanma; **spontaneous ~** öz-özünə yanma / alovlanma; **2**. *kim.* oksidləşmə

**combustion** [kəmˈbʌstʃn] *adj* yanma; ~ **chamber** *tex.* daxili yanma kamerası; ~ **engine** *tex.* daxili yanma mühərriyi

**come** [kʌm] *v (pt* **came** [keım]*; pp* **come***)* I *əsas fel kimi:* **1**. gəlmək; çatmaq, gəlib çatmaq; **to ~ to the office / meeting** işə / iclasa gəlmək; **to ~ home** evə gəlmək; *She comes here every day O hər gün bura gəlir; He often comes to see me O tez-tez mənə baş çəkir; Come to my house! Bizə gəl/gəlin! Come and see what I have found Gəl/Gəlin gör/görün mən nə tapmışam;* **to ~ late/early** gec/tez gəlmək; *The teacher hasn't come yet Müəllim hələ gəlməyib; The train comes at five o'clock Qatar saat beşdə gəlir; He came to London last night O dünən Londona gəldi;* **to ~ past** yanından ötüb keçmək; *A number of people came past Xeyli adam yanımızdan ötüb keçdi;* **to ~ and go** var-gəl etmək, gedib-gəlmək; **2**. (**to**) yaxınlaşmaq; *The train is coming to the station; Qatar vağzala gəlir; Come near! Yaxına gəl/ gəlin!* **3**. keçmək; *I now come to the second point Mən indi ikinci məsələyə keçirəm;* **4**. çatmaq, yaxınlaşmaq; *The forest came to the very bank Meşə düz sahilə çatırdı; Does the railway come right to the town? Dəmir yolu şəhərə lap yaxınlaşırmı? / çatırmı? The dress comes to her knees Don onun dizinə çatır; Through the open window came the sounds of a piano Açıq pəncərədən piano səsi gəlirdi;* **5**. əldə etmək, razılaşmaq; **to ~ to an understanding** razılığa gəlmək, razılıq əldə etmək, razılaşmaq; **to ~ to a decision** qərara gəlmək, qərar qəbul etmək; **to ~ to an end** sona çatmaq, qurtarmaq; **6**. baş vermək; irəli gəlmək; meydana gəlmək; *This comes from disobedience Bu itaətsizlikdən irəli gəlir;* **7**. qalmaq, çatmaq; *The house is coming to his son after his death Ölümündən sonra ev onun oğluna qalacaq/çatacaq*; **to ~ across** *smb.* **/** *smth.* bir kəslə/ bir şeylə təsadüfən rastlaşmaq; *I came across the man in the street Mən bu kişiyə küçədə rast gəldim; He came across this manuscript in the library O bu əlyazmasına kitabxanada təsadüf etdi;* **to ~ after** *smth.* bir şey üçün əlləşmək / çalışmaq; **to ~ after** *smb.* bir kəsi izləmək, bir kəsin arxasınca düşmək; **to ~ against** *smb.* bir kəsə hücum etmək / çəkmək; *The enemy now came against us in larger number İndi düşmən bizim üzərimizə daha böyük qüvvə ilə hücum etdi*; **to ~ at** *smb./smth.* bir kəsin/bir şeyin üstünə atılmaq; *The dog came at the boy İt oğlanın üstünə atıldı*; **to ~ at the truth** həqiqəti açmaq / müəyyən etmək; **to ~ into** *smth.* bir şeyi irsən əldə etmək/almaq, bir şeyə irsən sahib olmaq; *He came into some money / a property O irsən bir az pul / daşınmaz əmlak aldı*; **to ~ into office** vəzifəyə başlamaq, hakimiyyətə gəlmək; *He came into power O, hakimiyyətə gəldi*; **to ~ into use** istifadə olunmaq; **to ~ into effect/ force** qüvvəyə minmək; **to ~ into fashion** dəbə düşmək; **to ~ into being/existence** meydana gəlmək, törəmək, əmələ gəlmək; **to ~ into the world** dünyaya gəlmək, doğulmaq; **to ~ into conflict** konfliktə girmək, mübahisəyə girişmək; **to ~ into collision** toqquşmaq; zidd olmaq; **to ~ into notice** diqqəti çəkmək / cəlb etmək; **to ~ into the public eye** cəmiyyətin diqqətini cəlb etmək; **to ~ into prominence** məşhurlaşmaq; **to ~ into bloom/flower** çiçəkləmək, çiçək açmaq; **to ~ into ear** sünbülləmək, sünbül açmaq; **to ~ upon** *smb.* 1) rast gəlmək, təsadüf etmək, rastlaşmaq, qarşısına çıxmaq; bir kəslə təsadüfən qarşılaşmaq; **to ~ upon** *smth.* bir şeyə təsadüfən rast gəlmək; *We came upon them in London Biz təsadüfən onlarla Londonda qarşılaşdıq*; 2) bir kəsə / bir şeyə hücum etmək; *The enemy came upon us unawares Düşmən gözlənilmədən bizə hücum etdi*; **to ~ upon** *smb.* **for** *smth.* bir şeylə əlaqədar olaraq bir kəs qarşısında tələb qoymaq; **to ~ to do** *smth.* bir işi görməyə başlamaq; **to ~ to love** *smb.* bir kəsə bağlanmaq, bir kəsi sevmək; *Later I came to know him better Sonralar mən onu daha yaxşı tanıdım; In the end you will come to understand it Nəticədə sən/siz onu başa düşəcəksən/düşəcəksiniz*; **to ~ to a sudden stop** qəflətən dayanmaq

**come** [kʌm] *v (pt* **came** [keım]*; pp* **come***)* II *bağlayıcı fel kimi: İsmi xəbərin tərkib hissəsi olaraq işlənir:* olmaq; **to ~ undone** açılmaq; *Your shoelaces have come undone/untied/loose Sənin/Sizin ayaqqabının / ayaqqabınızın qaytanı açılıb;* **to ~ of age** həddi-büluğa çatmaq; **to ~ true** həyata keçmək, yerinə yetmək; *Some day our dream will come true Bir gün bizim arzumuz həyata keçəcək / yerinə yetəcək*; **to ~ easy** asanlaşmaq; *It will come very cheap / expensive to you Bu sizə ucuz / baha başa gələcək;* **to ~ about** baş vermək; *It came about this way Bu belə baş verdi;* **to ~ after** sonra / dalınca gəlmək; *After winter comes spring Qışdan sonra yaz gəlir;* **to ~ again** geri dönmək/qayıtmaq; **to ~ along** 1) bir kəslə birgə getmək; *Come along! Gedək, Gəl /Gəlin gedək; I want you to come along (with us) Mən istəyirəm ki, sən/siz bizimlə gedəsən/gedəsiniz;* 2) razılaşmaq, razı olmaq; *We explained our proposal, but he would not come along (with us) Biz təklifimizi izah etdik, lakin o (bizimlə) razılaşmadı*; **to ~ away** 1) getmək, aralaşmaq; *Come away from there, you are in danger Oradan aralaşın, təhlükəlidir; You are too near the stove, come away Sən/Siz sobaya çox yaxın durmusan/durmusunuz, bir az aralı dayan/dayanın*; 2) sınmaq,

sınıb/qopub düşmək, qırılmaq; *The handle came away in her hand Dəstək qırılıb / sınıb onun əlində qaldı / gəldi; I didn't tear out the page; it just came away in my fingers Mən səhifəni cırmadım; barmağım dəyən kimi özü cırıldı*; **to ~ back** 1) geri dönmək, qayıtmaq; *At what time will he come back? O nə vaxt geri qayıdacaq?* 2) yadına düşmək/gəlmək, xatırlamaq; *Dont' worry, it will all come back to you Narahat olma/olmayın, hər şeyi xatırlayacaqsan/xatırlayacaqsınız;* 3) özünə gəlmək; ayılmaq; **to ~ before** 1) daha vacib olmaq; *Your health comes before Sənin /Sizin sağlamlığın/sağlamlığınız daha vacibdir*; 2) qarşısında durmaq; *When he comes before the court... O, məhkəmə qarşısında duranda...*; **to ~ between** arasına girmək, ayrı salmaq; *He came between us O bizim aramıza girdi, O bizi ayrı saldı;* **to ~ by** 1) *(yandan)* keçmək / keçib getmək; *I will wait here until he comes by Mən onu buradan keçib gedənə qədər gözləyəcəyəm;* 2) əldə etmək, tapmaq, almaq; *This book is difficult to come by Bu kitabı tapmaq / əldə etmək çətindir;* **to ~ down** 1) aşağı düşmək, yerə enmək; *Prices came down Qiymətlər aşağı düşdü; Wait till she comes down Aşağı düşənə qədər onu gözlə / gözləyin; The plane came down safely Təyyarə sağ-salamat / rahatca yerə endi; The curtain came down Pərdə aşağı endi;* 2) yıxılmaq; *The child came down on his face Uşaq üzüstə yıxıldı;* 3) uçmaq, dağılmaq, sökülmək; *These houses are coming down soon Bu evlər tezliklə uçacaq*; 4) *amer. d.d.* xəstələnmək; *He came down with the grippe O, qripplə xəstələndi*; **to ~ forward** 1) irəli çıxmaq; *Volunteers come forward Könüllülər, irəli çıxın!* 2) öz xidmətini təklif etmək; *Nobody came forward to help us Heç kim / kəs bizə kömək gəlmədi;* 3) irəli çıxmaq, məşhurlaşmaq; populyar olmaq; **to ~ in** 1) içəri girmək, daxil olmaq; *Come in! Gəl!/Gəlin! Ask him to come in Ona de / deyin, içəri gəlsin*; 2) gəlmək, çatmaq, varid olmaq; *What time does the train come in? Qatar nə vaxt gəlir /çatır?* 3) *id.* finişə çatmaq; **to ~ in a close second** ikinci yer tutmaq; *His horse came in third Onun atı finişə üçüncü gəldi/çatdı*; 4) daxil olmaq, gəlmək; çatmaq; *The mail comes in at eight Poçt saat səkkizdə gəlir / daxil olur;* 5) dəbə düşmək; *This fashion is coming in again Bu moda yenə dəbə düşür;* 6) vəzifəyə girmək, hakimiyyətə gəlmək; *The government came in with a big majority Böyük səs çoxluğu ilə hökumət hakimiyyətə gəldi*; 7) yetişmək, dəymək; *These apples come in in summer Bu almalar yayda yetişir/dəyir*; **to ~ off** 1) düşmək; *Come off the tree Ağacdan düş/düşün; She came off the train O, qatardan düşdü;* 2) qopmaq, düşmək *(düymə və s. haq.); The handle came off Tutacaq qopdu*; 3) getmək, itmək *(ləkə haq.);* 4) tökülmək *(diş, saç və s. haq.);* 5) alınmaq, əmələ gəlmək; *It didn't come off Bundan heç nə çıxmadı; The experiment did not come off Təcrübədən bir şey əldə edilmədi, Təcrübədən bir şey çıxmadı;* 6) baş tutmaq, olmaq; *The bargain didn't come off Sövdə/Saziş baş tutmadı; The marriage came off after all Nəhayət toy oldu;* **to ~ on** 1) gəlmək, olmaq, düşmək; *Night was coming on Gecə düşürdü; A terrible storm came on Birdən dəhşətli tufan qopdu;* 2) rastlaşmaq, rast gəlmək, təsadüf etmək; qarşılaşmaq; *We shall come on it sooner or later Gec-tez biz bununla qarşılaşacağıq;* 3) meydana çıxmaq, söhbətin mövzusu olmaq *(məsələ və s. haq.); When his question came on.. Söhbət onun məsələsindən düşəndə...;* 4) dinlənilmək, baxılmaq *(məhkəmədə); My case comes on before the judge tomorrow Mənim işimə məhkəmədə sabah baxılacaq;* 5) irəliləmək, nailiyyət/müvəffəqiyyət qazanmaq; *He is coming on well in his studies O, təhsildə irəliləyir / müvəffəqiyyət qazanır;* 6) *d.d.* dəymək, yetişmək; *The crops are coming on well Məhsul yaxşı yetişir;* **to ~ out** 1) görünmək, çıxmaq, peyda olmaq, zahirə çıxmaq; *The moon came out Ay çıxdı / göründü;* 2) açılmaq *(yarpaq və s.); The leaves are coming out Yarpaqlar açılır;* 3) çapdan çıxmaq; *This book came out yesterday Bu kitab çapdan dünən çıxdı;* 4) açılmaq, məlum olmaq; *The truth will soon come out Həqiqət tezliklə məlum olacaq; Her secret came out Onun sirri açıldı;* 5) çıxmaq, alınmaq; *Her sums would never come out right Onun məsələsi heç vaxt düz çıxmırdı; She always comes out well O həmişə yaxşı çıxır (şəkildə);* 6) tökülmək *(diş, saç və s. haq.);* 7) yox olmaq, yoxa çıxmaq, itmək *(ləkə və s. haq.);* **to ~ out on strike** tətil etmək, tətilə başlamaq; **to ~ over** 1) bürümək, təsir altına almaq, hakim kəsilmək/olmaq; çulğamaq; *Sadness came over his spirit Kədər onu çulğadı, O kədərləndi; A fit of dizziness came over her Onun başı gicəldi / gicəlləndi;* 2) *d.d.* üstünlük qazanmaq; kələk gəlmək; 3) **(to)** bir kəsin tərəfinə keçmək; birləşmək; **to ~ over to *smb.'s* opinion** bir kəsin fikrinə şərik olmaq; **to ~ round** 1) ətrafından keçmək, yanından dolanmaq / ötmək; gəzib dolanmaq; *I had to come round by the village Mən kəndi dolanıb gəlməli oldum;* 2) özünə gəlmək; *He took a long time to come round Onun özünə gəlməsi xeyli vaxt apardı / çəkdi;* 3) yaxşı tərəfə dəyişmək; *I had confident expectations that things would come round Mən inanırdım ki, hər şey düzələcək;* 4) **(to)** inamını dəyişmək; *He came round to another way of thinking O, başqa cür düşünməyə başladı; I have come round to your way of thinking Mən sənin/sizin fikrinlə/fikrinizlə razılaşmağa meyllənirəm*; **to ~ through** 1) keçmək, islatmaq, daxil olmaq; *The rain has come through his clothes Yağış onun paltarını*



*tamamilə islatdı*; **to ~ through an illness** xəstəliyi yaxşı keçirmək; **to ~ to** özünə gəlmək; *It was many hours before he came to after being wounded Yaralandıqdan bir müddət sonra o özünə gəldi*; **to ~ together** 1) bir yerə toplaşmaq/yığışmaq, birləşmək; *The elections has compelled the parties to come together Seçkilər partiyaları birləşməyə məcbur etdi*; 2) yaşamaq *(qadınla kişi)*; **to ~ under** təsirə düşmək; **to ~ under *smb.'s* influence** bir kəsin təsiri altına düşmək; **to ~ up** 1) yuxarı qalxmaq / getmək; *She will come up as soon as she's ready Hazır olan kimi o yuxarı qalxacaq*; 2) yaxınlaşmaq, yaxına gəlmək; *A man came up to us Bir kişi bizə yaxınlaşdı;* 3) bitmək, çıxmaq *(bitki haq.); The seeds never came up Toxum əsla çıxmadı;* 4) qalxmaq, yüksəlmək; *Prices came up Qiymətlər qalxdı*; **to ~ within** daxil olmaq *(vəzifəyə və s.); That doesn't come within my duties Bu mənim vəzifəmə daxil deyil;*

◊ **to ~ in handy / useful** yaramaq, yararlı olmaq; **to ~ home** hədəfə düşmək; **to ~ home to *smb.*** 1) bir kəsin şüuruna çatmaq; 2) bir kəsi bərk mütəəssir etmək, bir kəsin qəlbinə bərk toxunmaq; **to ~ to good** yaxşı nəticə vermək; **to ~ to no good** pis nəticə vermək, pis qurtarmaq; **to ~ up smiling** müsibəti/fəlakəti/bədbəxtliyi dəyanətlə qarşılamaq; **to ~ out on top** *id.* yarışda qalib gəlmək; **to ~ to grief** xataya/bəlaya düşmək; çətin vəziyyətə düşmək; **to ~ short of *smth.*** bir şeydə ehtiyac hiss etmək; çatmamaq; *Her money came short of her expenditure Onun pulu xərclərinə çatmırdı*; **to ~ to life** özünə gəlmək, canlanmaq *(ürəkgetmədən sonra);* **to ~ to *one's* sense** 1) özünə gəlmək *(özündəngetmədən sonra);* 2) ağıllanmaq, ağlı başına gəlmək; **to ~ to light** aşkar olmaq, üzə çıxmaq; məlum olmaq; **to ~ in (to) sight/into view** görünmək, zahir/peyda olmaq; **to ~ in view (of)** 1) görmək; 2) görünmək; **to ~ to blows** dava ilə nəticələnmək, tutaşmaq; **to ~ to the point** əsl məsələdən/mahiyyətdən danışmaq; **to ~ into play** 1) fəaliyyət göstərməyə / fəaliyyətə başlamaq; 2) faydalı/xeyirli/sərfəli olmaq; **to ~ into the open** 1) səmimi / ürəyiaçıq olmaq; 2) məlum olmaq; **to ~ clean** *amer.* həqiqəti demək/söyləmək, səmimiyyətlə etiraf etmək; **to ~ to pieces** 1) parça-parça / qırıq-qırıq / çilik-çilik olmaq; 2) sağlamlığını korlamaq; 3) sıradan çıxmaq, xarab olmaq; **to ~ to heel** 1) izi ilə getmək, izləmək; 2) tabe olmaq, itaət etmək, boyun əymək; **to ~ out / through with clean hands** günahsız olmaq; *Everything comes to him who waits ≅ Səbir hər şeyi udur, Axtaran tapar*

**come-back** ['kʌmbæk] *n* 1. *d.d.* geri qayıtma / dönmə *(hakimiyyətə və s.);* **to make *one's* ~ *id.*** əvvəlki vəziyyətə qayıtmaq; 2. sağalma; 3. *amer.* əvəz / əvəzini vermə / çıxma; intiqam, intiqam alma; 4. *amer. d.d.* etiraz, etiraz etmə; ağıllı replika

**come-between** ['kʌmbı'twi:n] *n* vasitəçi; aradüzəldən; münsif

**come-by-chance** ['kʌmbaı'tʃa:ns] *n d.d.* 1. təsadüfi şey; 2. qanunsuz/kəbinsiz doğulmuş uşaq, bic

**comedian** [kə'mı:djən] *n* 1. komik *(komik rolları ifa edən aktyor)*, məzəli adam; 2. komediya müəllifi / yazan

**comedienne** [kə,medı'en] *n* komik rol ifa edən / oynayan aktrisa

**come-down¹** ['kʌmdaun] *n* 1. yıxılma, dağılma; süqut; 2. təhqir, həqarət; *She used to have servants; now she finds it a come-down to have to do the work herself O həmişə qulluqçu saxlayardı, indi bu işləri özünün görməsini özü üçün həqarət hesab edir*

**come down²** ['kʌm,daun] *v* 1. qalmaq; gəlmək; *This song comes down to us from the 18ᵗʰ century Bu mahnı bizə 18-ci əsrdən qalıb;* 2. ucuzlaşmaq, qiyməti aşağı düşmək; *I don't think meat will come down this year, do you? Mən belə hesab edirəm ki, ət bu il ucuzlaşmayacaq, sən / siz necə?* 3. gözdən düşmək, hörmətini itirmək; *John came down in my opinion after his bad behaviour at the dance Rəqs zamanı etdiyi yaramaz hərəkətindən sonra Con mənim gözümdən düşdü / düşüb;* 4. böyük şəhərdən balaca şəhərə / kəndə gəlmək; *The landowner comes down from London twice a year to visit his farm Mülkədar ildə iki dəfə Londondan təsərrüfatına baş çəkməyə gəlir*

**comedy** ['kɔmıdı] *n* 1. komediya; **musical ~** musiqili komediya; *I like Shakespear's comedies Mən Şekspirin komediyalarını xoşlayıram / sevirəm;* 2. komik / gülməli əhvalat; 3. hiyləgərlik, ikiüzlülük, riyakarlıq; **to cut the ~** hiyləgərliyə/riyakarlığa son qoymaq

**comeliness** ['kʌmlınıs] *n* gözəşirinlik, qanışirinlik, sevimlilik, cazibəli xarici görkəm, xoşsifətlilik

**comely** ['kʌmlı] *adj* **(-lier, -liest)** 1. sevimli, xoşsifət, gözəşirin, qanışirin, yapışıqlı; göyçək, qəşəng; 2. ədəbli, əxlaqlı, ləyaqətli, yaxşı *(əxlaq və s. haq.)*

**comer** ['kʌmə^r] *n* 1. gəlmə; özgə, yad, qərib; 2. gələn *(tamaşaya, görüşə və s. gələn adam)*; **first ~** birinci gələn; **~s and goers** gələnlər və gedənlər, gəlib-gedənlər

**comet** ['kɔmıt] *n astr.* kometa *(quyruqlu ulduz)*

**comet-finder** ['kɔmıt,faındə^r] *n astr.* kometa axtaran

**comfort¹** ['kʌmfət] *n* 1. təsəlli, təskin, təskinlik; ürək vermə, ruhlandırma; *This news is a great comfort to me Bu xəbər mənim üçün böyük təsəllidir / təskinlikdir;* **to find ~ in *one's* children** övladlarından təsəlli tapmaq; *My wife was a great comfort to me when I was ill Mən xəstə*

*olanda arvadım mənim üçün böyük təsəlli idi;* 2. rahatlıq, rahatlaşma; sakitlik, dinclik, asudəlik; istirahət, dincəlmə; **the ~ of solitude** tənhalığın/təkliyin rahatlığı; 3. komfort, rahatlıq; səliqə, qayda; 4. *(adət. pl)* rahatlıq; **home ~s** ev /məişət rahatlığı; **creature ~s** şəxsi istifadə şeyləri *(paltar, yemək, siqaret və s.)*; **to enjoy ~s** rahatlıqdan həzz almaq; *This hotel offers every modern comfort Bu mehmanxanada hər cür müasir rahatlıq var*; 5. *amer.* sırınmış yorğan

**comfort²** ['kʌmfət] *v* təskinlik/təsəlli vermək, sakitləşdirmək, sakit etmək; *I tried to comfort Jane after her mother's death Anasının ölümündən sonra mən Ceynə təsəlli / təskinlik verməyə çalışdım*

**comfortable** ['kʌmfətəbl] *adj* 1. rahat, qolay; əlverişli, münasib; **a ~ chair / room / bed, etc.** rahat stul / otaq / çarpayı və s.; **a ~ job** əlverişli/münasib iş; **to be ~** rahatlaşmaq; rahat olmaq; *The doctor said that mother was comfortable after her operation Həkim dedi ki, cərrahiyyə əməliyyatından sonra anam özünü rahat hiss etdi; Do you feel comfortable? Sən / Siz özünü /özünüzü rahat hiss edirsənmi/edirsinizmi?* 2. təsəlliverici, sakitləşdirici; **~ words** təsəlliverici / sakitləşdirici sözlər; **~ news** təsəlliverici / sevindirici xəbər; 3. *d.d.* kifayət qədər, lazımi qədər, münasib, yaxşı *(əmək haqqı, gəlir və s. haq.)*; **~ income** olduqca yaxşı gəlir

**comfortably** ['kʌmfətəblı] *adv* rahat, rahat bir tərzdə / surətdə; səliqə ilə, səliqəli

**comforter** ['kʌmfətə] *n* I 1. təsəlli/təskinlik verən, sakit edən, ovunduran; 2. yun kaşne/şərf; 3. boş əmzik; 4. *xüs. amer.* sıx isti çarpayı örtüyü

**comforter** ['kʌmfətə] *n* II müqəddəs ruh

**comfortless** ['kʌmfətlıs] *adj* 1. narahat, rahatlığı olmayan; 2. namünasib, münasib olmayan; səliqəsiz *(otaq və s. haq.)*

**comfort station** ['kʌmfət.steıʃn] *n* ictimai ayaqyolu; *d.d.* rahatxana

**comfrey** ['kʌmfrı] *n bot.* xəndəkotu

**comfy** ['kʌmfı] *adj* (-ier, -iest) = **comfortable**

**comic¹** ['kɔmık] *n* 1. komik *(komik rollar oynayan aktyor)*, məzəli adam; 2. *d.d.* komediya

**comic²** ['kɔmık] *adj* 1. komik, məzəli, gülməli, məzhəkəli; yumoristik; əyləncəli; **a ~ performance** komik/ gülməli tamaşa; **a ~ story** məzəli / gülməli əhvalat; **~ paper** yumoristik qəzet; 2. komediya; **~ writer** komediya yazan / müəllifi

**comical** ['kɔmıkl] *adj* gülməli, gülüş doğuran; **~ hat** gülüş doğuran papaq; **~ picture** karikatura, gülməli / gülüş doğuran şəkil

**comically** ['kɔmıklı] *adv* gülməli, əyləncəli, məzəli; qəribə, maraqlı; **to speak ~** məzəli / gülməli danışmaq

**comics** ['kɔmıks] *n pl* bulvar ədəbiyyatı; komik / gülməli kitablar

**coming¹** ['kʌmıŋ] *n* gəlmə, yetişmə; *With the coming of winter days get shorter Qışın gəlməsi ilə günlər gödəlir;* **~s and goings** gəliş-gediş; *We watched the comings and goings of the guests from our bedroom window Biz qonaqların gəlib-getməsini yataq otağımızın pəncərəsindən müşahidə etdik*

**coming²** ['kʌmıŋ] *adj* 1. gələcək, gələn; yaxınlaşan, gözlənilən; **~ storm** gözlənilən / yaxınlaşan tufan; **during the ~ summer** gələn yay ərzində/müddətində; 2. ümidverən, ümidverici; **a ~ young man** ümidverən gənc; **a ~ author** ümidverici müəllif

**Comintern** ['kɔmın'tə:n] *n* Komintern *(Kommunist İnternasionalı)*

**comity** ['kɔmıtı] *n* ədəb, nəzakət, mərifət; xoşrəftarlıq, mülayimlik; **~ of manner** xoşrəftarlıq, nəzakətli / ədəbli davranış

**comma** ['kɔmə] *n* vergül; **inverted ~s** dırnaq *(durğu işarəsi)*

**command¹** [kə'ma:nd] *n* 1. əmr, hökm, sərəncam, komanda; **at/ by *smb.'s* ~** kiminsə əmri ilə; **at the word of ~** komanda üzrə; **~ to advance** hücum komandası; **to give a ~** əmr / komanda vermək; **to revoke a ~** komandanı geri götürmək; 2. *hərb.* komandirlik etmə, komanda vermə; idarə /rəhbərlik etmə; **to suspend from ~** komandirlik etməkdən kənarlaşdırmaq; **to take ~** komandirlik etməyi öz üzərinə götürmək; **to be in ~ of a regiment** polka / alaya komandirlik etmək; **under ~ (of)** komandanlığı/rəhbərliyi altında *(bir kəsin)*; 3. *hərb.* hissə, birləşmə; hərbi dairə; 4. hökmranlıq, üstünlük; nəzarət; **~ of the sea** dənizdə hökmranlıq / üstünlük; **~ of emotions / passions** hissə / ehtirasa üstün gəlmə qabiliyyəti, hissi / ehtirası boğma; *He felt that he was really in command of the situation O hiss etdi ki, vəziyyətin ağasıdır; He has a good command of the English language O, ingilis dilini yaxşı bilir;* 5. sərəncam, əmr; **to be at *smb.'s* ~** bir kəsin əmrinə hazır / müntəzir olmaq; *I'm at your command Mən sənin / sizin əmrinə/əmrinizə müntəzirəm, Mən sənin /sizin qulluğunda/qulluğunuzda hazıram;*

◊ **chain of ~** xidməti pillə, subordinasiya *(xidmətdə vəzifəcə kiçiyin vəzifəcə böyüyə tabe olması prinsipi)*

**command²** [kə'ma:nd] *v* 1. əmr etmək / vermək; **to ~ silence** susmağı əmr etmək; *He commanded us to come at once O əmr etdi ki, biz dərhal gələk;* 2. komandirlik etmək, komanda vermək; **to ~ a battalion /a ship** batalyona / gəmiyə komandirlik etmək; *The king commands the armed forces Kral silahlı qüvvələrə komandirlik edir;* 3. nəzarət etmək; gizlətmək, saxlamaq *(hissi və s.); I advised him to command his temper Mən ona məsləhət gördüm ki, özünü ələ alsın;* 4. ixtiyarında / sərəncamında olmaq; *He commands vast sums of money Onun sərəncamında böyük məbləğdə pul var;* **to ~ a large vocabulary** geniş söz ehtiyatına malik olmaq; 5. ağalıq/hökmranlıq etmək; **to ~ the seas** dənizlərdə ağalıq / hökmranlıq etmək



**commandant** [.kɔmən'dænt] *n* 1. komandir, rəis; 2. komendant

**commander** [kə'ma:ndə] *n* 1. komandir, rəis; komandanlıq edən, komandan; *He became (the) commander of our group at the age of 25 İyirmi beş yaşında o bizim qrupun komandiri oldu;* **~ of an expedition** ekspedisiyanın rəisi; **~ of the guard** keşikçi rəisi; **~ in charge** 1) komandir vəzifəsini icra edən / yerinə yetirən; 2) əməliyyat rəhbəri; 2. kapitan

**commander-in-chief** [kə'ma:ndərın'tʃi:f] *n (pl* **commanders-** [kə'ma:ndəz-] *hərb.* baş komandan; *President is commander-in-chief in the Azerbaijan Armed Forces Azərbaycan silahlı qüvvələrinin baş komandanı prezidentdir*

**commandership** [kə'ma:ndəʃıp] *n* rəis vəzifəsi, rəislik, komandirlik, komandir vəzifəsi

**commanding** [kə'ma:ndıŋ] *adj* 1. komandanlıq edən; **~ officer** komandir; *Who's your commanding officer? Sənin/Sizin komandirin/komandiriniz kimdir?* **~ general** komandanlıq edən general; 2. hakim, hökmran, hökmranlıq edən; əsas, strateji, hakim mövqe/vəziyyət tutan; **~ hill** strateji yüksəklik; **~ views in literature** ədəbiyyatda hakim mövqe tutan fikirlər / görüşlər; 3. zəhmli, vahiməli, dəhşətli, görkəmli; amiranə; təsirli; çox böyük; **~ influence** çox böyük/qüvvətli təsir; **~ speech** təsirli nitq; **~ look** zəhmli/vahiməli/amiranə baxış; **~ voice** amiranə/zəhmli/təsirli səs; *My wife has such a commanding voice that everyone obeys her Mənim arvadımın elə bir amiranə / zəhmli səsi var ki, hamı ona tabe olur / itaət edir*

**commandment** [kə'ma:ndmənt] *n* 1. əmr, hökm, sərəncam; 2. ehkam; **the Ten Commandments** *bibl.* On ehkam

**commando** [kə'ma:ndou] *n (pl* **-dos, -does** [-douz] *hərb.* desant-təxribatçı dəstə *(İngiltərədə)*

**commemorable** [kə'memərəbl] *adj* unudulmaz, yaddançıxmaz, yaddaqalan

**commemorate** [kə'memərеıt] *v* 1. qeyd etmək, bayram etmək / keçirmək; **to ~ the revolution** inqilabın ildönümünü qeyd /bayram etmək; 2. təntənəli şəkildə qeyd / yad etmək, xatırlamaq

**commemoration** [kə'memə'reıʃn] *n* 1. qeyd /bayram etmə *(ildönümünü və s.)*; 2. *kils.* rəhmət duası oxuma; 3. şərəfinə ucaldılmış abidə; *This building is a commemoration of the battle of Waterloo Bu bina Vaterloo döyüşünün şərəfinə ucaldılmışdır*

**commemorative** [kə'memərətıv] *adj* xatirə; **~ tablet** xatirə lövhəsi

**commence** [kə'mens] *v* 1. başlamaq; **to ~ a lawsuit** məhkəmə işini başlamaq; 2. universitetdə elmi dərəcə almaq;

◊ *He who commences many things finishes but few at.söz.* ≅ *Bir əldə iki qarpız tutmaq olmaz, İki yana baxan çaş qalar*

**commencement** [kə'mensmənt] *n* 1. başlanğıc; 2. *universitet və ya kollec tələbələrinə dərəcə və ya diplom vermə mərasimi*

**commend** [kə'mend] *v* 1. qiymətləndirmək, tərifləmək, mədh etmək; *His work was highly commended Onun işini yüksək qiymətləndirdilər;* 2. heyran/valeh/cəzb etmək; *This book doesn't commend itself to me Bu kitab məni (özünə) cəlb etmir;* 3. *d.d.* tapşırmaq, həvalə etmək

**commendable** [kə'mendəbl] *adj* tərifəlayiq, tərifli, tərifə layiq olan

**commendation** [.kɔmen'deıʃn] *n* 1. tərif, mədh; 2. zəmanət vermə; zəmanət, tövsiyə, məsləhət; 3. *amer. hərb.* təşəkkür, minnətdarlıq, razılıq; *He was given a commendation for bravery after he saved the little children from the fire Balaca uşaqları yanğından xilas edərkən göstərdiyi igidliyə görə ona təşəkkür verdilər*

**commendatory** [kə'mendətərı] *adj* 1. tərifləyici, mədhedici; 2. zəmanət; **a ~ letter** zəmanət məktubu

**commensal** [kə'mensəl] *n* 1. yemək yoldaşı, həmsüfrə, bir yerdə yeyib-içən, kef yoldaşı; 2. *biol.* simbiont *(simbioz vəziyyətdə yaşayan orqanizmlərdən hər biri, yəni iki orqanizmin bir-birindən istifadə edərək yaşaması)*

**commensurable** [kə'menʃərəbl] *adj* müqayisə oluna /edilə bilən; proporsional; *The journey from New York to Los Angeles in 1976 is not commensurable with the same journey in 1876 Nyu Yorkdan Los Anjelesə 1976-cı ildə edilmiş səyahət 1876-cı ildə edilən eyni səyahətlə müqayisə edilə bilməz*

**commensurate** [kə'menʃərıt] *adj* uyğun gələn /olan, müvafiq olan, düz gələn; uyğun, müvafiq, mütabiq; bir əndazədə olan, taraz; *He was given a job commensurate with his abilities Ona bacarığına müvafiq iş verdilər*

**comment¹** ['kɔment] *n* 1. kommentari, izah, şərh; **to make ~s on a text** mətnə izahat / şərh vermək; *No comments, please! İzahata / Şərhə ehtiyac yoxdur! Comment is needless İzahat/Şərh artıqdır!* 2. kommentari vermə, izah / şərh etmə

**comment²** ['kɔment] *v* kommentari vermək, izah /şərh etmək; **to ~ on a text** mətnə izahat vermək, mətni şərh etmək; *The king refused to comment on the election results Kral seçkinin nəticələri haqqında izahat verməkdən imtina etdi*

**commentary** ['kɔməntərı] *n* 1. kommentari; izah, şərh; **running ~** 1) reportaj; **to keep up a running ~ on a match** yarış haqqında reportaj aparmaq *(radio vasitəsilə); His spirited commentary makes a match very interesting even*

on the radio Onun hətta radio vasitəsi ilə apardığı canlı reportaj yarışı çox maraqlı edir; 2) sətiraltı izahat / şərh; 2. kino. diktor mətni
commentation [.kɔmən'teɪʃn] n kommentari vermə, izah / şərh etmə (mətni)
commentator ['kɔmenteɪtə'] n 1. kommentator, şərhçi; 2. radiokommentator, radio şərhçisi
commerce ['kɔmə:s] n 1. topdansatış, ticarət, kommersiya; home ~ daxili ticarət; Chamber of Commerce Ticarət palatası; Our country has grown rich because of its commerce with other countries Digər ölkələrlə ticarət sayəsində vətənimiz dövlətlənib; 2. ünsiyyət, əlaqə; to have but little ~ with one's neighbours qonşularla az əlaqə saxlamaq; 3. cinsi əlaqə (xüs. kəbinsiz)
commercial[1] [kə'mə:ʃl] n radio, tel. 1. reklam və elanlar; 2. reklam, kommersiya verilişi; 3. d.d. kommivoyajör (ticarət agenti)
commercial[2] [kə'mə:ʃl] adj 1. ticarət, kommersiya; ~ treaty ticarət/kommersiya müqaviləsi; ~ custom ticarət adəti; ~ law ticarət qanunu; Our commercial laws are very old-fashioned Bizim ticarət qanunlarımız çox köhnədir; ~ court kommersiya məhkəməsi; ~ education ticarət təhsili; ~ attache ticarət üzrə attaşe; ~ aviation mülki aviasiya; ~ traveller kommivoyajör (ticarət agenti); 2. gəlirli, mədaxilli, qazanclı, mənfəətli; səmərəli; Oil has been found in commercial quantities in the Caspian Sea Xəzər dənizində neft qazanc / fayda verəcək miqdarda tapılıb; ~ film kommersiya filmi (qazanclı, gəlirli); ~ broadcast radioda reklam və elan verilişi; 3. tex. texniki; ~ tests zavodda keçirilən sınaqlar
commercialism [kə'mə:ʃəlizm] n 1. mənfəətpərəstlik, pulgirlik; gəlir/mənfəət güdmə prinsipi; 2. ticarət dilində işlədilən söz və ifadələr; 3. ticarət təcrübəsi
commercialize, -ise [kə'mə:ʃəlaɪz] v mənfəət/gəlir /qazanc götürmək, gəlir/qazanc/mənfəət mənbəyinə çevirmək; Do you agree with me that Christmas is too commercialized these days Sən /Siz mənimlə razısanmı/razısınızmı ki, bugünlərdə Milad bayramı gəlir / qazanc mənbəyinə çevrilib
commercially [kə'mə:ʃəlɪ] adv ticarət/kommersiya baxımından, gəlir/mənfəət/qazanc əldə etmək baxımından
commination [.kɔmɪ'neɪʃn] n təhlükələr, hədələr
comminatory ['kɔmɪnətərɪ] adj təhlükəli, qorxulu, hədələyici
commingle [kɔ'mɪŋgl] v qarışdırmaq, qatmaq; birləşdirmək; qarışmaq, birləşmək
comminute ['kɔmɪnju:t] v 1. xırda-xırda doğramaq, toz halına salmaq, toza döndərmək; 2. bölmək, xırda hissələrə ayırmaq (əmlakı və s.)
comminuted ['kɔmɪnju:tɪd] adj döyülmüş, döyülüb narınlaşdırılmış/toz halına salınmış; ~ fracture tib. çilik-çilik olmuş sümük sınığı
comminution [.kɔmɪ'nju:ʃn] n xırdalaşma, parçalanma, doğranma; dağılma, yayılma
commiserable [kə'mɪzərəbl] adj yazıq gəlməli, ürək/can yanmalı, mərhəmətə/şəfqətə layiq
commiserate [kə'mɪzəreɪt] v ürəyi yanmaq, dərdinə şərik olmaq, şəfqət göstərmək; başsağlığı vermək; to ~ with smb. on his loss bir kəsə baş vermiş itki ilə əlaqədar olaraq başsağlığı vermək
commiseration [kə.mɪzə'reɪʃn] n dərdinə şərik olma, başsağlığı, başsağlığı vermə
commissar [.kɔmɪ'sa:] n komissar
commissariat [.kɔmɪ'seərɪət] n 1. komissariat, komissarlıq; 2. intendantlıq (orduda hərbi təsərrüfat işlərinə baxan idarə)
commissary ['kɔmɪsərɪ] n 1. komissar; 2. müvəkkil; 3. təsərrüfat-ərzaq anbarı; 4. hərb. hərbçilər üçün ərzaq mağazası
commission[1] [kə'mɪʃn] n 1. etibarnamə, səlahiyyət, vəkalətnamə, vəkalət; to hold a ~ from the government dövlət səlahiyyəti/vəkaləti olmaq; to act within one's ~ öz səlahiyyəti dairəsində hərəkət etmək; to go beyond one's ~ öz səlahiyyətini aşmaq, səlahiyyətindən kənara çıxmaq; 2. tapşırıq, tapşırılmış iş; to carry out a ~ successfully tapşırığı uğurla/müvəffəqiyyətlə yerinə yetirmək; 3. sifariş (xüs. rəssama verilən); 4. komissiya, komitet; ~ of inquiry yoxlama/istintaq komissiyası; permanent ~ daimi komissiya /komitet; to appoint/to establish a ~ komissiya təşkil etmək; to sit on the government ~ dövlət komissiyasında fəaliyyət göstərmək; 5. ilk zabit rütbəsi; ilk zabit rütbəsinin verilməsi; 6. sülh məhkəməsinin bu vəzifəyə təyin edilən zaman ona verilən şəhadətnamə; ~ of peace sülh məhkəməsinin təyin edilməsi (patent vermə yolu ilə); 7. günah/xata etmə; ~ of murder qətlə yetirmə, öldürmə; 8. dən. təchiz etmə; işə salma; a ship in ~ üzməyə hazır olan gəmi; to come into ~ səfərə hazırlaşmaq (gəmi haq.)
commission[2] [kə'mɪʃn] v 1. səlahiyyət / vəkalət vermək; tapşırıq vermək; The king commissioned an artist to paint a picture of the Queen Kral kraliçanın şəklini çəkməyi bir rəssama tapşırdı; 2. vəzifəyə təyin etmək; to ~ an officer hərb. rütbə vermək; I was commissioned a general in 1939 Mənə general rütbəsi 1939-cu ildə verildi; 3. dən. səfərə/üzməyə hazırlamaq (gəmini); şəxsi heyəti müəyyənləşdirmək; gəmini komandanlığa vermək
commissionaire [kə.mɪʃə'neə'] n 1. xidmətçi (mehmanxanada); 2. qapıçı (mehmanxanada, teatrda, mağazada və s.)
commission-broker [kə'mɪʃən.broukə'] n dəllal, makler
commissioned [kə'mɪʃənd] adj 1. səlahiyyətli, səlahiyyət/vəkalət verilmiş; 2. tapşırıq verilmiş / almış; 3. hərb. zabit rütbəsi almış; ~ officer zabit; 4. şəxsi heyətlə təmin edilmiş səfərə hazır olan (gəmi haq.)



commissioner [kə'mɪʃnə'] n 1. xüsusi səlahiyyət verilmiş komissar; nümayəndə; High Commissioner Ali Komissar (müstəmləkələrdə və ya Britaniya dominionlarında İngiltərənin nümayəndəsi); 2. komissiya üzvü
commit [kə'mɪt] v (-tt-) 1. etmək; to ~ an error /a sin səhv/günah etmək; to ~ suicide intihar etmək, özünü öldürmək; 2. pozmaq (asayişi və s.); to ~ a breach of the peace ictimai asayişi pozmaq; 2. tapşırmaq, tapşırıq vermək, həvalə etmək; inanmaq, inanıb tapşırmaq; to ~ a task to smb. bir kəsə tapşırıq vermək; to ~ a child to the care of a nurse uşağı dayənin himayəsinə vermək; 3. vermək; to ~ for trial müttəhimi məhkəməyə vermək; müttəhimi məhkəmə məsuliyyətinə cəlb etmək; 4. (to) tapşırmaq; to ~ a body to the ground/to the earth cənazəni torpağa tapşırmaq; to ~ to the flames yandırmaq; to ~ to oblivion xatirindən silmək, unutmaq; to ~ to memory əzbərləmək, əzbər öyrənmək; yadda saxlamaq; to ~ to paper/to writing yazmaq, qeyd etmək; to ~ to action hərb. hücuma atmaq/qoşmaq; 5. salmaq, qoymaq; yerləşdirmək; to ~ to prison/to jail həbsxanaya /qalaya salmaq, həbs etmək; He was committed to a lunatic asylum Onu ruhi xəstələr xəstəxanasına qoydular; to ~ oneself öz üzərinə təəhhüd/öhdəçilik götürmək; He was committed himself to support his brother's children O, qardaşı uşaqlarının qayğısına qalmağı öz üzərinə götürdü
commitment [kə'mɪtmənt] n 1. təəhhüd, öhdəlik, öhdəçilik; treaty ~s müqavilə təəhhüdü, razılaşdırılmış təəhhüd; to meet ~s öhdəliyi yerinə yetirmək; to make no ~s heç bir öhdəlik götürməmək; 2. vermə, təhvil vermə; təslim etmə; tapşırma; 3. həbs/dustaq etmə, tutma; 4. həbs etmə üçün order
committal [kə'mɪtl] n 1. həbs etmə, həbsə alma; 2. ruhi xəstələr üçün xəstəxanaya göndərmə / qoyma; 3. dəfn, basdırma; dəfn mərasimi
committed [kə'mɪtɪd] adj 1. ideyalı, öz ideyasına sadiq, əqidəli; ~ writer ideyalı/əqidəli yazıçı; 2. öz işinə/peşəsinə vurğun; ~ teacher öz peşəsinə vurğun müəllim
committee [kə'mɪtɪ] n 1. komitet, komissiya; executive/preparatory ~ icraiyyə/hazırlıq komitəsi; drafting ~ redaksiya komissiyası; credentials ~ mandat komissiyası; standing ~ daimi komissiya; strike ~ tətil komitəsi; resistance ~ müqavimət komitəsi; to appoint/to set up a ~ komitə/komissiya təşkil etmək; 2. qəyyum
committeeman [kə'mɪtɪmən] n (pl -men [-mən]) komitənin/komissiyanın üzvü
committeeship [kə'mɪtɪʃɪp] n hüq. qəyyumluq, hamilik (xüs. ruhi xəstələr üçün)
commode [kə'moud] n 1. komod (siyirməli paltar şkafı); 2. yerindən tərpədilə bilən/köçürülə bilən əlüzyuyan; 3. gecə qarşoku üçün oturacaq; 4. amer. ayaqyolu
commodious [kə'moudjəs] adj 1. geniş (xüs. otaq, ev, mənzil haq.); 2. d.d. rahat, qolay; əlverişli, münasib
commodity [kə'mɔdɪtɪ] n (əsas. pl) əmtəə, mal; staple commodities əsas ərzaqlar/mallar; scarce commodities aztapılan/defisit mallar; Wine is one of the many commodities that France sells abroad Şərab Fransanın xaricə satdığı çoxlu mallardan biridir
commodore ['kɔmədɔ:'] n 1. dən. birinci dərəcəli kapitan; birləşmiş gəmilər dəstəsinin komandiri (İngiltərədə); 2. konvoy komandiri; 3. amer. kapitan rütbəsindən yuxarı istefaya çıxmış dəniz zabiti; 4. yaxt-klubun komandiri
common[1] ['kɔmən] n 1. icma torpaqları; 2. ümumi otlaq / örüş; Every Saturday Tom went riding on the village common Hər şənbə Tom at sürmək üçün kənd örüşünə gedərdi; Harlow Common is very beautiful in winter Qışda Harlou örüşü çox gözəl olur; 3. birgə / elliklə istifadə hüququ (torpaqdan və s.); ~ of pasturage örüşdən birgə / elliklə istifadə hüququ; 4. çəpərlənməmiş boş torpaq
common[2] ['kɔmən] adj 1. ümumi; birgə, bir yerdə; ~ language/market ümumi dil/bazar; ~ kitchen ümumi mətbəx; ~ effort birgə səy /cəhd; ~ interests ümumi maraqlar; ~ advantage ümumi fayda; by ~ consent birgə razılıqla; to make ~ cause ümumi iş görmək; 2. ictimai, icma; ~ property 1) icma torpağı; 2) hüq. ümumi mülkiyyət / əmlak; ~ land ictimai örüş / otlaq; 3. geniş yayılmış, çoxişlənən; adi; ~ error adi / tez-tez təsadüf edilən səhv; This word/expression is in common use in English Bu söz / ifadə ingilis dilində geniş işlənir; It is common knowledge that Hamıya məlumdur ki,...; ~ salt xörək duzu; ~ soldier sıravi əsgər; ~ honesty adi təvazökarlıq/doğruluq; This sort of weather is quite common Bu növ hava adi haldır; 4. riyaz. sadə; ~ fraction adi kəsir; 5. sadə, kobud, qaba, vulqar; ~ manners kobud xasiyyət; She has a common look Onun vulqar görkəmi var; ~ furniture sadə /kobud mebel; 6. qram. ümumi; ~ case ümumi hal; ~ gender ümumi cins; 7. riyaz. ortaq; ~ multiple ortaq vuran;
◊ ~ council bələdiyyə soveti; şəhər soveti; ~ school amer. ibtidai məktəb; ~ woman fahişə, qəhbə; at the ~ rate bazar qiymətinə / məzənnəsinə; in ~ birlikdə, bir yerdə, bərabər; to have nothing in ~ ümumi heç nəyi olmamaq; as ~ as dirt adi, gözəçarpmayan, heç nə ilə se-

çilməyən; *I don't like this girl, she is as common as dirt Mən bu qızı xoşlamıram, o çox adidir / heç nə ilə fərqlənmir*

**commonable** ['kɔmənəbl] *adj* 1. ictimai mülkiyyətdə olan; 2. ictimai örüşdə otlamağa icazəsi olan *(heyvan haq.)*

**commonage** ['kɔmənɪdʒ] *n* ictimai /ümumi örüş

**commoner** ['kɔmənə'] *n* 1. əsli-kökü bilinməyən adam; 2. təqaüd almayan və yemək üçün pul verən tələbə *(Oksford universitetində)*; 3. icma hüquqlarına sahib olan adam

**commonly** ['kɔmənlɪ] *adv* 1. adətən, adət üzrə, bir qayda olaraq; *His name is John, but he is commonly known as Jack Onun adı Condur, lakin o, Cək kimi tanınır;* 2. pis, ucuz, orta

**commonness** ['kɔmənnɪs] *n* 1. adilik; mənasızlıq, məzmunsuzluq; 2. babatlıq, orta dərəcədə olma

**commonplace**[1] ['kɔmənpleɪs] *n* 1. adi/bayağı /çeynənmiş / köhnə ifadə; mənasızlıq, məzmunsuzluq; *I'm tired of listening to his political speeches; they're full of commonplace Mən onun siyasi çıxışlarına qulaq asa bilmirəm; onlar çeynənmiş ifadələrlə doludur;* 2. qeyd, qeydə alma/götürmə

**commonplace**[2] ['kɔmənpleɪs] *adj* 1. adi; ümumi; *Soon it will be commonplace for men to travel to the moon Tezliklə aya səyahət adamlar üçün adi şey olacaq;* 2. maraqsız, mənasız; adi; **a ~ book** mənasız /maraqsız kitab; **a ~ person** adi adam; 3. çeynənmiş, çoxişlənən; **a ~ expressions** çeynənmiş / çoxişlənən ifadələr

**commonplace**[3] ['kɔmənpleɪs] *v* 1. qeyd kimi dəftərə yazmaq; 2. çeynənmiş / çoxişlənən ifadələri təkrar etmək

**commonplace-book** ['kɔmənpleɪs'buk] *n* qeyd və s. üçün dəftər

**common prayer** ['kɔmənpreə'] *n* liturgiya *(xristianların ən əsas ibadət ayini)*

**common room** ['kɔmənrum] *n* ümumi otaq *(ictimai müəssisələrdə)*; **senior ~** professorlar otağı *(ali məktəblərdə)*; **junior ~** tələbələr üçün ümumi otaq *(Oksford universitetlərində)*

**commons** ['kɔmənz] *n* *(Özündən sonra fel cəmdə işlənir)*; 1. **the Commons** nümayəndələr palatası/məclisi; 2. adi adamlar; 3. üçüncü zümrə / təbəqə; 4. *Bu mənada* **commons** *sözündən sonra fel təkdə işlənir*; bir adama gündəlik verilən azuqə və pay; **to be / to go on short ~** doymamaq, kəsirlə yemək

**commonwealth** ['kɔmənwelθ] *n* 1. dövlət; respublika; **the Commonwealth of England** *tar.* İngiltərənin respublikası (1649-61-*ci illər*); birlik, dostluq; federasiya; **the (British) Commonwealth (of Nations)** Xalqların Britaniya Dostluğu; 2. *ümumi maraq ətrafında birləşmiş şəxslərin ittifaqı*; **~ of artists / of literary men** rəssamların/ ədiblərin ittifaqı/birliyi

**commotion** [kə'mouʃn] *n* həyəcan, çaxnaşma, təşviş, vəlvələ; *"Why is there so much commotion coming from this room?" asked the angry teacher "Bu otaqda nə çaxnaşma / vəlvələ düşüb?" deyə acıqlanmış müəllim soruşdu;* 2. sarsıntı; sarsıma; **~ of the nerves** əsəb sarsıntısı; **~ of the spirits** ruhi sarsıntı; 3. iğtişaş, qarışıqlıq; **political ~** siyasi iğtişaş;

◊ **to put / to set in ~** hərəkətə gətirmək, həyəcanlandırmaq, iğtişaş salmaq

**communal** ['kɔmjunl, kə'mju:nl] *adj* 1. icma; 2. kommunal, şəhər təsərrüfatına aid olan, ictimai; **~ property** ictimai mülkiyyət; 3. kommunaya aid olan

**Communard** ['kɔmjuna:d] *n tar.* kommunar *(Paris kommunasının iştirakçısı)*

**commune**[1] ['kɔmju:n] *n* 1. icma; 2. kommuna; **the Commune of Paris** Paris Kommunası

**commune**[2] [kə'mju:n] *v* 1. *şair.* məhrəmanə / dostcasına / səmimi / ürəkdən söhbət etmək; **to ~ with nature** təbiətlə ünsiyyətdə olmaq; 2. *kils.* priçastiye ayini icra etmək

**communicable** [kə'mju:nɪkəbl] *adj* 1. keçən, keçə / keçirilə bilən; **~ disease** keçə bilən / infeksion xəstəlik, yoluxucu xəstəlik; 2. mehriban, gülərüzlü, üzügülər, xoşrəftar; səmimi, lütfkar; ünsiyyətli

**communicant** [kə'mjunɪkənt] *n* xəbərverən, xəbərçi, məlumatverən

**communicate** [kə'mju:nɪkeɪt] *v* 1. xəbər / məlumat vermək, bildirmək; keçirmək, yoluxdurmaq *(xəstəliyi)*; **to ~ news to *smb.*** bir kəsə xəbər vermək / çatdırmaq; **to ~ a disease** xəstəliyi keçirmək; 2. (with) əlaqəyə girmək, əlaqə saxlamaq; **to ~ with *one's* neighbours** qonşularla əlaqə saxlamaq; **to ~ by telephone/by telegram** telefonla/teleqramla əlaqə saxlamaq/əlaqəyə girmək; 3. bitişmək, birləşmək; yapışıq/bitişik olmaq *(otaq, ev, ərazi və s. haq.)*; *Our bedroom communicates with the bathroom Bizim yataq otağımız hamam otağı ilə bitişikdir*; **countries communicating by a canal** kanalla birləşən ölkələr

**communication** [kə.mju:nɪ'keɪʃn] *n* 1. məlumat / xəbər vermə, veriliş; *All communications with France were stopped when the enemy gained control of the sea Düşmən dənizə nəzarəti ələ aldıqdan sonra Fransa ilə bütün əlaqələr/verilişlər dayandırıldı; Radio and television are important means of communication Radio və televiziya vacib məlumat vermə vasitəsidir*; 2. yayma, yoluxdurma *(xəstəliyi)*; **~ of disease** xəstəlik yayımı; 3. ünsiyyət, əlaqə; **to be in ~ with *smb.*** bir kəslə ünsiyyət/əlaqə saxlamaq; bir kəslə yazışmaq; 4. məlumat, məlumat vermə, xəbər, xəbər vermə, məlumat / xəbər alma; **to receive a ~** məlumat / xəbər almaq; 5. rabitə, kommunikasiya; əlaqə; **telegraphic ~** teleqraf rabitəsi; **wireless ~** radio ilə/vasitəsilə



əlaqə; *There is no communication between the two rooms Bu iki otaq arasında əlaqə yoxdur*

**communication**[2] [kə.mju:nɪ'keɪʃn] *adj* əlaqə, rabitə; məlumat; **~ channel** əlaqə / rabitə kanalı; **~ officer** *hərb.* rabitə hissəsi rəisi; **~ theory** məlumat nəzəriyyəsi

**communicative** [kə'mju:nɪkətɪv] *adj* adamayovuşan, ünsiyyətli; mehriban; söhbətcil, danışqan

**communion** [kə'mju:njən] *n* 1. ümumilik, birlik; 2. *şair.* əlaqə, rabitə; **close ~ with nature** təbiətlə sıx əlaqə; **~ with *one's* fellows** yoldaşları ilə əlaqə; 3. din birliyi; **to be of the ~** eyni dinə mənsub olmaq

**communiquè** [kə'mju:nɪkeɪ] *n fr.* rəsmi məlumat; **joint ~** birgə rəsmi məlumat

**communism** ['kɔmjunɪzm] *n* kommunizm

**communist**[1] ['kɔmjunɪst] *n* kommunist

**communist**[2] ['kɔmjunɪst] *adj* kommunist; **the Communist Party** Kommunist Partiyası

**community** [kə'mju:nɪtɪ] *n* 1. icma, koloniya; **foreign ~ in a country** xaricilərin hər hansı bir ölkədə icması / koloniyası; **religious ~** dini icma / cəmiyyət; 2. **(the ~)** cəmiyyət; **the welfare of the ~** cəmiyyətin rifahı/firavanlığı; 3. cəmiyyət; **international ~** beynəlxalq cəmiyyət; 4. ümumilik, birlik; **~ of opinions** fikir birliyi; **~ of race** irq birliyi, eyni irqə mənsub olma

**commutable** [kə'mju:təbl] *adj* dəyişdirilə / əvəz edilə bilən

**commutation**[1] [.kɔmju:'teɪʃn] *n* 1. dəyişmə, dəyişdirmə, əvəz etmə, əvəz; 2. cəzanı yumşaltma; **~ of the death-penalty to penal servitude for life** ölüm cəzasını ömürlük katorqa cəzası ilə əvəz etmə; 3. *amer.* şəhərətrafı qəsəbədən hər gün dəmir yolu ilə işə getmə; 4. *el.* kommutasiya *(dəyişən cərəyanın sabit cərəyana çevrilməsi)*

**commutation**[2] [.kɔmju:'teɪʃn] *adj*: **~ ticket** *amer.* 1) mövsümi bilet; 2) güzəştli bilet

**commutator** ['kɔmju:teɪtə'] *n el.* 1. kollektor *(dinamo maşınında dəyişən elektrik cərəyanının daimi cərəyana çevrildiyi silindr)*; 2. kommutator *(elektrik cərəyanını açıb bağlayan və ya onun istiqamətini dəyişdirən aparat)*

**commute** [kə'mju:t] *v* 1. **(into, for)** dəyişdirmək, əvəz etmək *(xüs. bir növ əmək haqqını başqa növlə)*; 2. **(for, to, into)** *hüq.* cəzanı yumşaltmaq; **to ~ the death-penalty to imprisonment for life** ölüm cəzasını ömürlük həbs cəzası ilə əvəz etmək; *His punishment was commuted from death to life imprisonment by the judge Hakim onun ölüm cəzasını ömürlük həbslə əvəz etdi*; 3. *amer.* mövsümi biletdən istifadə etmək; 4. mütəmadi olaraq şəhər kənarından şəhərə işə gedib-gəlmək; *She commutes from Cambridge to London every day O hər gün Kembricdən Londona gəlib-gedir;* 5. *el.* dəyişdirici açar *(elektrikdə, mexanizmdə və s.)*

**commuter** [kə'mju:tə'] *n* 1. *amer.* mövsümi və ya güzəştli biletdən istifadə edən sərnişin; 2. = **commutator**

**commutual** [kə'mju:tʃl] *adj şair.* qarşılıqlı, ikitərəfli

**compact**[1] ['kɔmpækt] *n* I razılaşma, razılıq, saziş, müqavilə; **by ~** razılaşma üzrə, müqaviləyə görə

**compact** ['kɔmpækt] *n* II 1. pudra / kirşan qutusu; 2. sıxcam pudra / kirşan

**compact**[2] [kəm'pækt] *adj* 1. sıxcam, kip, sıx; möhkəm; *The trees grew in a compact mass Ağaclar toplu halında sıx bitmişdi*; 2. yığcam, qısa *(üslub haq.)*; **a ~ style** yığcam üslub; *His book was written in a compact style Onun kitabı yığcam üslubda yazılıb*

**compact**[3] [kəm'pækt] *v* 1. birləşdirmək; 2. sıxlaşdırmaq, kipləşdirmək; 3. müqavilə/saziş bağlamaq; *In 1733 France compacted with Spain 1733-cü ildə Fransa İspaniya ilə saziş / müqavilə bağladı*

**compacted** [kəm'pæktɪd] *adj* kompakt, kip, sıx, sıxcam, yığcam; kip qablanmış / yerləşdirilmiş

**compaction** [kəm'pækʃn] *n* 1. sıxma, qısma; sıxlaşdırma, sıxlaşma; 2. sıxlıq, kiplik, yığcamlıq

**compactly** [kəm'pæktlɪ] *adv* sıx, sıx-sıx, sıx surətdə, kip

**compactness** [kəm'pæktnɪs] *n* kiplik, sıxcamlıq, yığcamlıq

**companion**[1] [kəm'pænjən] *n* 1. yoldaş; **faithful ~** sadiq /sədaqətli/vəfalı yoldaş; **~ of *one's* youth** gənclik illərinin dostu; **~ in crime** cinayət yoldaşı; 2. yoldaş, kompanyon; 3. *d.d.* kompanyon, partnyor, oyundaş *(idmanda, səhnədə, kart oyununda və s.)*; 4. həmsöhbət, müsahib, söhbət yoldaşı; **poor ~** maraqsız/maraq oyatmayan həmsöhbət; **boon ~** kefcil adam, kef yoldaşı, kefcil içki yoldaşı; 5. yol yoldaşı, təsadüfi qonşu; **my ~ in the railway-carriage** mənim vaqondakı yol yoldaşım; 6. cüt şeyin tayı; *Here's the glove for my left hand but where's its companion? Mənim sol əlcəyim buradadır, bəs onun o biri tayı hanı?* 7. *d.d.* soraq/arayış/məlumat kitabçası; **The Gardener's Companion** bağbanın məlumat kitabçası

**companion**[2] [kəm'pænjən] *v* 1. yoldaş/ kampanyon /yol yoldaşı /partnyor olmaq; 2. *d.d.* dostluq etmək; dostlaşdırmaq; 3. *arx.* həmsöhbət / söhbət yoldaşı olmaq

**companionable** [kəm'pænjənəbl] *adj* adamayovuşan, ünsiyyətli, mehriban; gülərüzlü, üzügülər; xoşüzlü, nəvazişkar, xoşrəftar, iltifatlı

**companionship** [kəm'pænjənʃɪp] *n* 1. yoldaşlıq/ dostluq münasibəti, yoldaşlıq; **to enjoy the ~ of *smb.*** bir kəslə dostluq etmək; **~ of many years** çoxillik yoldaşlıq münasibətləri; 2. *metranpajın rəhbərliyi altında işləyən mürəttiblər qrupu*

**company**[1] ['kʌmpənɪ] *n* 1. cəmiyyət, kampaniya; yoldaşlıq, dostluq; *I'll come with you for com-*

*pany Mən səninlə / sizinlə dostluq xatirinə gedəcəm;* **to keep / to bear** *smb.* ~ bir kəsə yoldaş / dost olmaq; **to keep ~ with** *smb.* bir kəslə görüşmək / dostluq etmək *(xüs. gənc oğlan və qız haq.);* **to keep good ~** yaxşı mühitdə olmaq, yaxşı adamlarla oturub-durmaq/əlaqə saxlamaq; **to get into bad ~** pis mühitə/kampaniyaya düşmək; **to get into bad ~ with** *smb.* pis mühitə düşmək; **to fall into ~ with** *smb.* bir kəslə təsadüfi tanış olmaq; **to part ~ with** *smb.* bir kəslə tanışlığı kəsmək, bir kəsdən ayrılmaq; **to be good/bad/poor ~** yaxşı/maraqlı/pis/maraqsız həmsöhbət olmaq; 2. *iqt.* cəmiyyət, kompaniya, şirkət, **insurance ~** sığorta cəmiyyəti; **Joint Stock Company** Səhmdar Cəmiyyəti; 3. *d.d.* qonaq, qonaqlar; **to receive a great deal of ~** çoxlu qonaq qəbul etmək; *We expect company tomorrow Biz sabah qonaq gözləyirik;* 4. daimi truppa *(aktyorların);* ansambl; **theatrical ~** teatr truppası; 5. *hərb.* rota, bölük *(batalyon tərkibinə daxil olan hərbi hissə);* 6. ekipaj, heyət *(gəminin);*

◊ **to know a man by his ~** ≅ adamı dostları vasitəsilə tanımaq; *Two is company but three is none at.söz.* ≅ *İki adam olduğu yerdə üçüncünün olması artıqdır; As a man is, so is his company at.söz. Siz necəsinizsə, dosutunuz da elədir; Who keeps company with the wolf will learn to howl at.söz.* ≅ *Atı atın yanına bağlasan həmrəng olmasa da, həmxasiyyət olar*

**company²** [ˈkʌmpənɪ] *adj* rota; **~ commander** rota komandiri; **~ clerk** rota katibi *(hərbi hissədə);* **~ officers** *amer.* kiçik zabit heyəti

**company³** [ˈkʌmpənɪ] *v* 1. əlaqə / ünsiyyət saxlamaq, tanışlıq etmək; oturub-durmaq; 2. *arx.* ötürmək, yola salmaq, müşayiət etmək, birgə / bərabər getmək

**comparable** [ˈkɔmpərəbl] *adj* müqayisə oluna bilən/edilə bilən, qarşılaşdırıla / tutuşdurula bilən

**comparative** [kəmˈpærətɪv] *adj* 1. müqayisəli; **~ method of investigation** müqayisəli tədqiqat metodu; **a ~ study of European languages** Avropa dillərinin müqayisəli öyrənilməsi; **~ linguistics** tarixi-müqayisəli dilçilik; **~ grammar** müqayisəli qrammatika; **~ anatomy** müqayisəli anatomiya; 2. müqayisə; **~ degree of adjectives** sifətlərin müqayisə dərəcəsi; *"Shorter" is the comparative degree of "short" "Shorter" "short" sifətinin müqayisə dərəcə formasıdır;* 3. nisbi; **to live in ~ comfort** nisbi rahatlıqda yaşamaq, nisbətən rahat yaşamaq

**comparatively** [kəmˈpærətɪvlɪ] *adv* 1. nisbətən; **~ easy/difficult/high** nisbətən asan/çətin/ hündür; 2. müqayisəli; **to learn languages ~** dilləri müqayisəli öyrənmək; *These 2 languages must be studied comparatively Bu 2 dil müqayisəli öyrənilməlidir*

**compare¹** [kəmˈpeə] *n arx.* müqayisə; **beyond / without ~** müqayisəyə gəlməyən; *She is lovely beyond compare Gözəllikdə ona tay yoxdur, Onun gözəlliyi müqayisə olunmazdır*

**compare²** [kəmˈpeə] *v* 1. **(with)** müqayisə etmək /olunmaq, tutuşdurmaq, tutuşdurub yoxlamaq; **to ~ a translation with the original** tərcüməni orijinalla tutuşdurub yoxlamaq; *He can't compare with you O səninlə / sizinlə müqayisə edilə bilməz; If you compare Marx's work with Hegel's, you'll find many differences Əgər sən/siz Marksın əsərini Hegelinki ilə müqayisə etsən/etsəniz, çoxlu fərqlər taparsan/taparsınız; It's impossible to compare the two books; they are quite different Bu iki kitabı müqayisə etmək mümkün deyil; onlar tamamilə fərqlidir;* 2. dərəcə formalarını düzəltmək *(sifətin və ya zərfin); Compare the adjective "nice" "Nice" sifətinin dərəcə formalarını düzəlt / düzəldin;*

◊ **to ~ notes** fikir mübadiləsi etmək

**comparison** [kəmˈpærɪsn] *n* müqayisə; **to draw / to make a ~ (between)** müqayisə aparmaq *(arasında);* **to bring into ~** müqayisə etmək; **to bear/to stand ~ with** müqayisəyə layiq olmaq, müqayisə edilə bilmək; *There is no comparison between them Onları müqayisə etmək olmaz;* **without ~, out of all ~** müqayisəsiz;

◊ **~s are odious** ≅ *Hər cür müqayisə eybəcərlikdir / yerinə düşmür*

**compart** [kəmˈpa:t] *v arx.* hissələrə bölmək/ ayırmaq, bölmək; *The interior was comparted by screens Otaq içəridən şırmalarla / pərdələrlə bölünmüşdü*

**compartition** [kəmˈpa:tɪʃn] *n arx.* bölgü, bölmə; şöbə; ara, aralıq

**compartment** [kəmˈpa:tmənt] *n* şöbə; kupe; *We sat in the third compartment from the front of the carriage Biz vaqonun əvvəlindən üçüncü kupedə oturduq*

**compass¹** [ˈkʌmpəs] *n* 1. kompas; bussol *(geodeziyada işlənən ölçü cihazı);* **points of the ~** dünyanın cəhətləri; 2. çevrə, dairə; ətraf, ətraf yerlər; **to go/to set/to take a ~** dolayı yolla getmək, dolama yolla gedib artıq dövrə vurmaq; 3. hüdud, sərhəd, hədd *(zaman və məkan haq.);* müddət, ərz; **within the ~ of a lifetime** insan ömrü müddətində / ərzində; **to keep** *one's* **desires within ~** arzularını cilovlamaq, arzulara hüdud / hədd qoymaq

**compass²** [ˈkʌmpəs] *v* 1. əldə etmək, çatmaq, yetişmək; həyata keçirmək; **to ~** *one's* **purpose** məqsədini həyata keçirmək, məqsədinə çatmaq; 2. fikirləşmək, düşünmək, niyyətində/fikrində/ qəsdində olmaq *(bir işi görməyin);* **to ~ murder** öldürmək qəsdində/fikrində/niyyətində olmaq; 3. dairə vurmaq, fırlanmaq, dolanmaq; **the ship wherein Magellan ~ed the world** Magellanın dünyanı dolandığı gəmi

**compassion¹** [kəmˈpæʃn] *n* canı yanma; mərhəmət, yazığı gəlmə; *Her heart was filled with compassion for the child Onun uşağa çox yazığı gəlirdi / ürəyi yanırdı;* **to have ~ upon/on** *smb.* bir kəsə ürəyi / canı yanmaq, bir kəsə yazığı gəlmək



**compassion²** [kəmˈpæʃn] *v* ürəyi/canı yanmaq, yazığı gəlmək

**compassionate** [kəmˈpæʃənɪt] *adj* rəhmli, rəhmdil, şəfqətli, ürəyiyanan, canıyanan; şəfqət göstərən, ürəyiyumşaq, yumşaqürəkli; **~ heart** rəhmli/şəfqətli ürək; **~ allowance** xeyriyyə yardımı/müavinəti

**compassionately** [kəmˈpæʃənɪtlɪ] *adv* xeyirxahlıqla, mərhəmətlə, hüsn-rəğbətlə; şəfqətlə

**compatibility** [kəm.pætəˈbɪlɪtɪ] *n* bir yerdə ola bilmə, bir araya sığa/yerləşə bilmə; uyğunluq; uzlaşma; birləşmə, əlaqələnmə

**compatible** [kəmˈpætəbl] *adj* uyğunlaşa / birləşə bilən; bir yerdə ola bilən, bir yerə sığa bilən, uzlaşan, uzlaşa bilən

**compatriot** [kəmˈpætrɪət] *n* vətəndaş, yurddaş, həmvətən, həmyerli

**compel** [kəmˈpel] *v* (-ll-) 1. məcbur/vadar etmək; *The rain compelled us to stay at home Yağış bizi evdə qalmağa məcbur / vadar etdi; He was compelled by illness to give up smoking Xəstəlik onu papiros çəkməyi tərgitməyə məcbur /vadar etdi;* 2. əldə etmək, nail/müvəffəq olmaq; **to ~ obedience/silence** itaətə / sakitliyə nail olmaq; 3. tabe etmək, güzəştə getməyə məcbur / vadar etmək; **to ~** *smb.* **to** *one's* **will** bir kəsi öz iradəsinə tabe etmək

**compelling** [kəmˈpelɪŋ] *adj* rəfedilməz, kənar edilə bilməyən, aradan qaldırıla bilməyən, dəfedilməz; **~ force** dəfedilməz/qarşısıalınmaz qüvvə

**compendious** [kəmˈpendɪəs] *adj* qısa, yığcam, müxtəsər, qısaldılmış

**compensate** [ˈkɔmpenseɪt] *v* 1. **(for)** əvəzini vermək, yerini doldurmaq, ödəmək, kompensasiya/əvəzini vermək; **to ~** *smb.* **for a loss/for a damage** bir kəsə itki /ziyan üçün əvəz vermək; **to ~ injury** itki üçün kompensasiya vermək; *Many firms compensate their workers if they are hurt at work Fəhlələr iş zamanı zədə alsalar, bir çox firmalar onlara kompensasiya verir;* 2. mükafatlandırmaq, mükafat vermək; *May this success compensate for your earlier failure Qoy bu qələbə sənin / sizin əvvəlki uğursuzluğuna/uğursuzluğunuza bir mükafat olsun;* 3. tarazlamaq; tarazlaşmaq, bərabərləşdirmək

**compensation** [.kɔmpenˈseɪʃn] *n* 1. əvəzi verilmə, əvəzini vermə, ödəmə; kompensasiya *(əvəz);* **to make/to pay ~ for** *smth.* bir şey üçün kompensasiya / əvəz vermək; **claim for ~** dəyən ziyanı / zərəri ödəmə iddiası; **~ for injury** şikəstlik/əlillik üçün kompensasiya; 2. mükafatlandırma, mükafat vermə; mükafat; *amer.* maaş, məvacib, donluq, aylıq; pul mükafatı; **the ~ of employees** qulluqçulara pul mükafatı vermə; 3. müvazinət, tarazlıq, müvazinət saxlama; 4. *tib.* bərpa etmə, əvvəlki halına salma /qaytarma; tarazlaşdırma

**compensative** [kəmˈpensətɪv] *adj* = **compensatory**

**compensator** [ˈkɔmpenseɪtə] *n* 1. kompensator *(mexanizmlərin iş şəraitini tarazlaşdırmaq və s. üçün işlədilən müxtəlif cihazlar);* 2. *el.* avtotransformator *(cərəyan gərginliyini azaldan birsarğılı transformator)*

**compensatory** [kəmˈpensətərɪ] *adj* 1. əvəzedici, ödəyən, kompensasiya verən; **~ tariff** *siya. iq.* kompensasiya/ödəmə tarifi *(rəsmən müəyyən edilmiş tədiyə, rüsum, maaş və s. cədvəli);* 2. mükafatlandırıcı, mükafat verən; 3. tarazlayıcı, taraz edən, balanslaşdırıcı

**compere** [ˈkɔmpeə] *n fr.* konferansye *(konsert proqramının nömrələrini elan edən artist)*

**compere** [ˈkɔmpeə] *v fr.* konferansyelik etmək *(konsertdə və s.)*

**compete** [kəmˈpi:t] *v* 1. yarışmaq, yarışa girişmək, yarışda iştirak etmək; **to ~ in a race** cıdırda/cıdır yarışında iştirak etmək; **to ~ with others for a prize** priz almaq uğrunda digərləri ilə yarışda iştirak etmək; 2. rəqabət aparmaq; *Tradesmen compete with one another Ticarətçilər bir-biri ilə rəqabət aparırlar;* **to ~ against other countries in trade** başqa ölkələrlə ticarət rəqabəti aparmaq

**competence** [ˈkɔmpɪtəns] *n* 1. bacarıq, qabiliyyət; məharət, istedad; **~ to direct the enterprise** müəssisəni idarə etmək qabiliyyəti/məharəti/bacarığı; 2. bolluq, firavanlıq, rifah; varlılıq; **to enjoy a modest ~** cüzi maddi təminatı olmaq; 3. *hüq.* səlahiyyət, səriştəlilik; *This case is beyond this court's competence Bu məsələ bu məhkəmənin səlahiyyətindən kənardır*

**competent** [ˈkɔmpɪtənt] *adj* 1. səriştəli, bilən, mötəbər, bilikli; **~ teacher** təcrübəli /bilikli müəllim; **~ authority** səriştəli / mötəbər mütəxəssis; 2. tələbə cavab verən, lazımi, lazım gələn/olan; *He has a competent knowledge of law O, hüquq / qanun sahəsində lazımi biliyə malikdir;* 3. *hüq.* səlahiyyətli, səlahiyyəti olan, tam ixtiyarı olan; *This court is not competent to deal with your case Bu məhkəmə sənin/sizin işinə/işinizə baxmaq üçün səlahiyyətli deyil*

**competition** [.kɔmpɪˈtɪʃn] *n* 1. yarış, yarışma; müsabiqə; **boxing/swimming ~** boks/üzgüçülük üzrə yarış; **qualifying ~s** *id.* seçmə yarışı; **chess ~** şahmat yarışı; **to enter a ~** yarışa qoşulmaq/qatılmaq; **to win a ~** yarışda qalib gəlmək, yarışı udmaq; **to be in ~ with** *smb.* bir kəslə yarışmaq; 2. rəqabət; **~ between two countries** iki ölkə arasında rəqabət; **cut-throat / keen / severe ~** amansız/kəskin/qızğın rəqabət; **to meet ~** rəqabətə tab gətirmək/dözmək; 3. konkurs, konkurs imtahanı

**competitioner** [ˌkɔmpɪ'tɪʃnəʳ] *n* **1.** rəqib *(həm də vəzifə tutmaq üçün müsabiqədə iştirak edən)*; **2.** yarış iştirakçısı

**competitive** [kəm'petɪtɪv] *adj* **1.** yarışan, yarışda iştirak edən, yarış iştirakçısı; **2.** konkurs; ~ **examination** konkurs imtahanı; **3.** rəqabətə tab gətirən; rəqabətə dözümlü; ~ **price** rəqabətə dözümlü qiymət, rəqabətə tab gətirən qiymət

**competitor** [kəm'petɪtəʳ] *n* rəqib

**compilation** [ˌkɔmpɪ'leɪʃn] *n* **1.** tərtib etmə *(məlumat kitabı və s.)*; kompilyasiya *(müstəqil tədqiqat aparmadan, başqalarının əsərlərindən istifadə yolu ilə düzəldilən əsər)*; **2.** faktların/statistik rəqəmlərin toplanması

**compile** [kəm'paɪl] *v* **1.** tərtib etmək *(lüğət və s.)*; **to ~ a dictionary / an anthology** lüğət/antologiya tərtib etmək; *It takes years of hard work to compile a good dictionary Yaxşı lüğət tərtib etmək illərlə ağır zəhmət tələb edir;* **2.** yığmaq, toplamaq *(material, statistik rəqəmlər və s.)*

**compiler** [kəm'paɪləʳ] *n* tərtibçi; kompilyator, kompilyatorçu, kompilyasiyaçı, kompilyasiya ilə məşğul olan adam

**complacency** [kəm'pleɪsnsɪ] *n* **1.** özünü bəyənmə, özündən razı olma; **2.** razılıq, razı/məmnun qalma, məmnunluq

**complacent** [kəm'pleɪsnt] *adj* **1.** özünübəyənən, özündən razı olan, özünü başqalarından üstün tutan, məğrur; ~ **smile** məğrur təbəssüm; **2.** xidmət/qulluq göstərən; iltifatlı

**complain** [kəm'pleɪn] *v* **1.** şikayət/narazılıq etmək, şikayətlənmək, gileylənmək; **to ~ of headaches /of loneliness** başağrısından /təklikdən şikayət etmək; *Mary is always complaining about smth. Meri həmişə bir şeydən şikayətlənir;* **2.** *hüq.* şikayət vermək, cinayət işi açmaq / qaldırmaq; *Our next-door neighbour said he'd complain about us to the police if we made any more noise Bizim qapıbir qonşumuz dedi ki, əgər bir də səs salsaq, bizdən polisə şikayət verəcək*

**complainant** [kəm'pleɪnənt] *n hüq.* şikayətçi, iddiaçı, tələb edən

**complaint** [kəm'pleɪnt] *n* **1.** narazılıq; narazılığın səbəbi; *My chief complaint is that... Mənim narazılığımın əsas səbəbi ondan ibarətdir ki,...;* **2.** şikayət, giley; ah-nalə, sızıltı; *She is full of complaints O həmişə şikayət edir;* **to make a ~** şikayət/giley etmək; **3.** *hüq.* iddia, tələb; cinayət işi qaldırma; **to lodge / to make/ to prefer a ~ against** *smb.* bir kəs qarşısında iddia qaldırmaq; bir kəsə qarşı cinayət işi qaldırmaq; *A complaint has been lodged against you with police Polis sənə / sizə qarşı cinayət işi qaldırıb;* **bill of ~** iddia ərizəsi; yazılı şikayət; **4.** xəstəlik, naxoşluq; kefsizlik, nasazlıq; ağrı; **a ~ of the liver** qaraciyər ağrısı; *He's suffering from a heart complaint O, ürək ağrısından əziyyət çəkir;*
◊ *He who makes constant complaints gets little compassion Aramsız olaraq şikayətlənən adama yazıq gəlməz*

**complaisance** [kəm'pleɪzəns] *n* iltifat, lütfkarlıq; qulluq göstərmə; xoşrəftarlıq, mülayimlik, nəzakət; **to abuse** *smb.'s* ~ bir kəsin lütfkarlığından sui-istifadə etmək

**complaisant** [kəm'pleɪzənt] *adj* xidmət/ qulluq göstərən, iltifatlı, gülərüzlü, lütfkar; hörmətli, ehtiramlı, möhtərəm; *He's complaisant, cordial and well-bred O, iltifatlı, ürəyiyumşaq və tərbiyəlidir*

**complement¹** ['kɔmplɪmənt] *n* **1.** tamamlama, tamamlanma, tamamlayan, tamamlayıcı şey; *A good wine is a complement to a good meal Yaxşı şərab yaxşı yeməyin tamamlayıcısıdır;* **2.** *qram.* tamamlıq; **3.** komplekt, dəst; **4.** *hərb.* hissənin yaxud gəminin şəxsi heyəti; *This ship carried a complement of 930 men Bu gəmidə 930 adamdan ibarət heyət vardı*

**complement²** ['kɔmplɪmənt] *v* tamamlamaq, əlavə etmək; doldurmaq; *This wine complements the food perfectly Bu şərab yeməyi əla tamamlayır*

**complemental** [ˌkɔmplɪ'mentl] *adj* tamamlayan, tamamlayıcı

**complementary** [ˌkɔmplɪ'mentərɪ] *adj* əlavə, əlavə verilən/edilən; ~ **factor** əlavə amil/faktor; ~ **colours** əlavə rənglər *(spektrdə)*; *Irish farming and British industry are complementary. Each provides what other needs İrlandiya fermer təsərrüfatı və Britaniya sənayesi bir-birini tamamlayır. Onların hər biri digərinin ehtiyacını ödəyir*

**complete¹** [kəm'pli:t] *adj* **1.** bütöv, tam; ~ **set** tam / bütöv dəst; ~ **edition of Shakespeare's works** Şekspirin əsərlərinin tam / bütöv nəşri; ~ **disarmament / unanimity** tam silahsızlaşma (tərksilah) / həmrəylik; ~ **independence** tam müstəqillik/istiqlaliyyət; ~ **combustion** tam yanma; ~ **overhaul** *tex.* əsaslı təmir; ~ **reaction** *kim.* dönməz reaksiya; ~ **operation order** *hərb.* tam hərbi əmr; **2.** bitmiş; *His work is now complete Onun işi artıq bitib/tamamlanıb;* **3.** tamamilə, büsbütün; ~ **stranger** tamamilə yad adam; ~ **fool** tamamilə axmaq/səfeh/gic/sarsaq; *It was a complete surprise to me Bu mənim üçün tamamilə gözlənilməz idi;* **4.** mahir, məharətli, kamil, qabil, bacarıqlı; **a ~ master** mahir / məharətli / kamil usta

**complete²** [kəm'pli:t] *v* **1.** qurtarmaq, başa /sona çatdırmaq, tamamlamaq; yerinə yetirmək; **to ~ a task** tapşırığı yerinə yetirmək; **to ~ a second / third year** ikinci / üçüncü kursu qurtarmaq; *The house is not completed yet Ev hələ tikilib qurtarmayıb; I need one more stamp to complete my collection Kolleksiyamı tamamlamaq üçün mənə bir dənə də marka lazımdır;* **2.** komplektləşdirmək; *I need one more volume to complete my set of Dickens's works Dikkensin seçilmiş əsərlərini komplektləşdirmək üçün mənə bir cild də lazımdır;* **3.** yerinə yetirmək, həyata keçirmək *(arzunu, andı, istəyi və s.)*



**completely** [kəm'pli:tlɪ] *adv* büsbütün, tamamilə; mükəmməl surətdə; tam, lap, bütün; *He is completely convinced/satisfied O tamamilə əmindir / razıdır; The house was completely rebuilt Ev tamamilə/büsbütün yenidən tikildi; He is completely ruined O tam/tamamilə/ büsbütün müflisləşib*

**completeness** [kəm'pli:tnɪs] *n* tamlıq, bütövlük; bitkinlik, tamamlıq, mükəmməllik

**completion** [kəm'pli:ʃn] *n* **1.** qurtarma, tamamlama; başa çatma, tamamlanma, bitmə, başa çatdırılma; ~ **of a task/of a plan / of an undertaking** tapşırığın/planın / tədbirin tamamlanması /başa çatdırılması; ~ **of education** təhsilin bitməsi /başa çatması/qurtarması; *Completion of this bridge is expected in 2003 Bu körpünün tikilib qurtarması 2003-cü ildə gözlənilir; The road is nearing completion, it should be finished soon Yolun çəkilməsi qurtarmaq üzrədir, o bu yaxınlarda qurtarmalıdır;* **to reach ~ 1)** qurtarmaq, bitmək, tamamlanmaq; **2)** kamilliyə çatmaq; **2.** icra etmə, yerinə yetirmə, əməl etmə/edilmə; həyata keçirmə/keçirilmə *(arzunun, ideyanın və s.)*

**completive** [kəm'pli:tɪv] *adj* tamamlayıcı, həlledici; bitirən, qurtaran

**complex¹** ['kɔmpleks] *n* kompleks *(bir tam təşkil edən şeylərin və hadisələrin məcmusu)*; **a sport ~** idman kompleksi; **a big industrial ~** böyük sənaye kompleksi; **a leisure ~** istirahət kompleksi

**complex²** ['kɔmpleks] *adj* **1.** mürəkkəb; **a ~ system** mürəkkəb sistem; ~ **machinery** mürəkkəb maşınlar; ~ **apparatus** mürəkkəb cihaz; ~ **number** *riyaz.* mürəkkəb rəqəm; **2.** çətin, qarışıq, dolaşıq, mürəkkəb; ~ **situation** çətin /mürəkkəb/dolaşıq vəziyyət; ~ **process** çətin /mürəkkəb proses; **3.** *qram.* mürəkkəb; ~ **object / attribute** mürəkkəb tamamlıq/təyin; ~ **sentence** mürəkkəb cümlə

**complexion** [kəm'plekʃn] *n* **1.** üzün /sifətin rəngi; **dark/rosy/fair ~** qara/al/ağ sifət; **2.** görkəm, görünüş, təhdidedici sifət/baxış, nöqteyi-nəzər; **the threatening ~ of the sky** göyün/səmanın təhdidedici/qorxunc görkəmi; **the political ~ of Eastern Europe** Şərqi Avropanın siyasi sifəti /siması; **3.** *arx.* temperament, təbiət, mizac

**complexity** [kəm'pleksɪtɪ] *n* mürəkkəblik, dolaşıqlıq, çətinlik

**compliance** [kəm'plaɪəns] *n* **1.** razılıq, icazə; **in ~ with your wish** sənin/sizin arzunla / arzunuzla; **in ~ with her request** onun xahişi ilə, onun xahişinə uyğun olaraq; **2.** güzəştə getmə, tez razılaşma, yolayovuqluq, yumşaqlıq, üzüyolalıq; xoşa gəlməyə çalışma; qulluq göstərmə, yaltaqlıq, yaltaqlanma; **base ~** çirkin yaltaqlıq/ riyakarlıq/ ikiüzlülük

**compliant** [kəm'plaɪənt] *adj* **1.** tez razılaşan / təsir altına düşən/yola gələn / ipə yatan; üzüyola, yolayovuq; **2.** qulluq göstərən, yaramağa çalışan; yaltaq; *I don't respect people who are too compliant Mən qulluq göstərməyə çalışan adamlara hörmət etmirəm*

**complicacy** ['kɔmplɪkəsɪ] *n* mürəkkəblik, dolaşıqlıq; ~ **of the subject** mövzunun mürəkkəbliyi / dolaşıqlığı

**complicate** ['kɔmplɪkeɪt] *v* mürəkkəbləşdirmək, dolaşdırmaq; **to ~ matters** işləri / məsələləri mürəkkəbləşdirmək/dolaşdırmaq; **to ~ a situation** vəziyyəti mürəkkəbləşdirmək / dolaşdırmaq

**complicated** ['kɔmplɪkeɪtɪd] *adj* **1.** mürəkkəb, dolaşıq, başa düşülməsi çətin olan, çətin; ~ **system** mürəkkəb/çətin sistem; ~ **problem** mürəkkəb/dolaşıq / çətin problem; ~ **puzzle** başa düşülməsi çətin olan tapmaca/bilməcə; *Don't ask me such complicated questions Mənə belə çətin suallar vermə/verməyin;* **2.** mürəkkəbləşmiş, mürəkkəbləşdirilmiş, çətinləşmiş, çətinləşdirilmiş; ~ **disease** *tib.* ağırlaşmış xəstəlik; ~ **dislocation** *tib.* ağır çıxıq; **3.** mürəkkəb; ~ **mechanism /engine / apparatus** mürəkkəb mexanizm /motor / cihaz

**complicatedly** ['kɔmplɪkeɪtɪdlɪ] *adv* çətin, başa düşülməyəcək bir tərzdə, dolaşıq bir tərzdə, mürəkkəb; **to speak ~** çətin başa düşüləcək bir tərzdə danışmaq

**complicatedness** ['kɔmplɪkeɪtɪdnɪs] *n* mürəkkəblik, çətinlik, dolaşıqlıq

**complicative** ['kɔmplɪkeɪtɪv] *adj arx.* çətinləşdirən, mürəkkəbləşdirici, dolaşdırıcı

**complicity** [kəm'plɪsɪtɪ] *n* **1.** iştirak etmə, əlbir olma, əli olma *(cinayətdə, pis işdə)*; **2.** = **complexity**

**compliment¹** ['kɔmplɪmənt] *n* **1.** kompliment, xoş söz, iltifat, tərif; **to pay/to make a ~** kompliment / xoş söz demək; **to return the ~** komplimentə komplimentlə cavab vermək; **to angle / to fish for ~s** kompliment istəmək; **left-hand/doubtful ~** şübhəli / ikibaşlı kompliment; **2.** iltifat, lütfkarlıq; şərəf; **to do** *smb.* **the ~ of inviting him to dinner** lütfkarlıq göstərib bir kəsi nahara dəvət etmək; *I take it as a compliment to be asked to speak Danışmaq üçün söz verilməsini mən şərəf hesab edirəm;* **3.** *pl* salam, təzim; təbrik; *Give my compliments to your wife Mənim salamımı arvadına/arvadınıza yetir/yetirin;* **with ~s** hörmət və ehtiramla *(məktubun sonunda yazılır)*

**compliment²** ['kɔmplɪmənt] *v* **1.** kompliment demək, təriflәmək; **to ~ a lady on her appearance** xanıma xarici görünüşünə aid kompliment demək; **to ~** *smb.* **on his speech** bir kəsi nitqinə / çıxışına görə təriflәmək; **2.** salamlamaq, təbrik etmək; **to ~** *smb.* **on his progress** bir kəsi nai-

liyyətinə görə təbrik etmək; **to ~ *smb.* with the degree of master of Arts** humanitar elmlər üzrə magistr dərəcəsi almaq münasibəti ilə bir kəsi təbrik etmək; 3. **(with)** bağışlamaq, peşkəş/hədiyyə etmək, hədiyyə/ peşkəş vermək

**complimentary** [ˌkɔmplı'mentərı] *adj* 1. təbrik; **~ speech** təbrik nitqi; 2. havayı, pulsuz; **a ~ ticket** havayı / pulsuz bilet; **a ~ ticket for concert** konsertə dəvətnamə / pulsuz bilet; 3. kompliment deməyi sevən; **to be ~ about the performance/the scenery** tamaşa/dekorasiya haqqında yaltaqcasına fikir söyləmək

**compline** ['kɔmplın] *n kils.* axşam ibadəti *(katoliklərdə)*

**comply** [kəm'plaı] *v* 1. (*pt, pp* **-lied) (with)** yerinə yetirmək; **to ~ with *smb.'s* request/*smb.'s* wish** bir kəsin xahişini/arzusunu yerinə yetirmək; 2. **(with)** tabe olmaq; **to ~ with the rules** qayda-qanuna tabe olmaq/itaət etmək; *People who refuse to comply with the law will be punished Qanuna tabe olmayan/itaət etməyən adamlar cəzalandırılacaq;* 3. razılaşmaq, güzəştə getmək; *Threats, commands, entreaties were useless; he would not comply Hədələr, əmrlər, yalvarışlar heç bir fayda vermədi; o razılaşmadı*

**component**[1] [kəm'pounənt] *n* komponent, hissə, tərkib hissəsi, tamın hissəsi; **the ~s of a collocation** frazeoloji birləşmənin komponenti / tərkib hissələri; **the ~s of an engine** motorun hissələri

**component**[2] [kəm'pounənt] *adj* tərkib, tərkibinə daxil olan; **~ parts** tərkib hissələr; **~ parts of a sentence** cümlənin tərkib hissələri / üzvləri

**comport**[1] ['kɔmpɔ:t] *n* hündür oturacaqlı vaza *(meyvə və şirniyyat üçün)*

**comport**[2] [kəm'pɔ:t] *v* 1. aparmaq *(özünü)*, davranmaq; **to ~ oneself** özünü aparmaq, davranmaq; **to ~ decently** özünü ədəbli / ləyaqətli aparmaq; **to ~ oneself with dignity** özünü ləyaqətlə aparmaq; 2. **(with)** uyğun/müvafiq/ münasib olmaq, düz gəlmək; *His conduct doesn't comport with his position in society Onun hərəkəti onun cəmiyyətdə tutduğu mövqeyə uyğun gəlmir*

**compose** [kəm'pouz] *v* 1. yazmaq, yaratmaq, bəstələmək *(ədəbi və ya musiqi əsəri);* 2. *poliqr.* yığmaq; 3. yoluna qoymaq, qaydaya salmaq, həll etmək *(mübahisəni); The two leaders composed their disagreement and were soon the best of friends again Bu iki rəhbər öz aralarındakı narazılığı qaydaya saldılar/yoluna qoydular və yenidən möhkəm dost oldular;* 4. sakitləşdirmək, sakitləşmək; **to ~ oneself** sakitləşmək; *Jane was nervous at first but soon composed herself Ceyn əvvəlcə əsəbi idi, lakin tezliklə sakitləşdi;* 5. ibarət olmaq; **to be ~d of ingredients** müxtəlif tərkiblərdən ibarət olmaq; *Water is composed of hydrogen and oxygen Su hidrogendən və oksigendən ibarətdir*

**composed** [kəm'pouzd] *adj* 1. yazılmış *(əsər və s.)*, bəstələnmiş *(musiqi əsəri);* **songs ~ by U.Hajibayov** Ü.Hacıbəyovun bəstələdiyi mahnılar; 2. sakit, dinc, təmkinli, səbirli, özünü saxlaya bilən, təvazölü, ehtiyatlı; **a ~ look** sakit /təmkinli/ təvazölü görünüş; **a ~ manner** təmkinli davranış; **~ face** sakit / səbirli sifət

**composedly** [kəm'pouzdlı] *adv* təlaşsız, təmkinlə, arxayınca, sakit, sakitcə, aramla; **to speak ~** aramla / sakit / sakitcə / arxayınca / təmkinlə danışmaq

**composer** [kəm'pouzə(r)] *n* bəstəkar, bəstəçi; *U.Hajibayov is one of the well-known composers of the 20$^{th}$ century Ü.Hacıbəyov 20-ci əsrin tanınmış bəstəçilərindən biridir;* **Beethoven and other great ~s** Bethoven və başqa böyük bəstəkarlar

**composing** [kəm'pouzıŋ] *adj* 1. bəstələyən; 2. sakitləşdirici, sakitedici; **~ medicine** sakitləşdirici / sakitedici dərman

**composing-machine** [kəm'pouzıŋmə'ʃi:n] *n poliq.* nabor maşını

**composing-room** [kəm'pouzıŋ'ru:m] *n poliq.* nabor otağı

**composite** ['kɔmpəzıt] *adj* 1. tərkibi, mürəkkəb; qarışıq; **~ style** qarışıq üslub; **~ photograph** fotomontaj; **~ book** bir neçə müəllifin əsərindən ibarət məcmuə/toplu; **~ carriage** *d.y.* kombinə edilmiş vaqon; **~ vessel** qarışıq materiallardan *(dəmir və ağacdan)* tikilmiş gəmi; 2. *bot.* mürəkkəbçiçəklilər; **~ flowers** mürəkkəbçiçəklilər fəsiləsi

**composition** [ˌkɔmpə'zıʃn] *n* 1. tərtib etmə, tərtib; qurma, düzmə, düzülmə; 2. tərkib; **a chemical ~** kimyəvi tərkib; 3. inşa; **to write ~** inşa yazmaq; 4. *qram.* mürəkkəb söz düzəltmə; 5. *poliq.* nabor, düzüm *(yığılmış hərflər)*; 6. musiqi əsəri; ədəbi əsər; təsviri sənət əsəri; 7. kompozisiya, quruluş; **the ~ of a picture** şəklin kompozisiyası; **the ~ of speech** nitqin quruluşu; 8. tərkib; **~ of a ministry/parliament** nazirliyin/parlamentin tərkibi; *id.* komandanın tərkibi; 9. barışıq və ya atəşkəs haqqında razılıq/müqavilə; 10. *hüq.* borclunun kredit verənlə kompromis razılığı

**compositive** [kəm'pɔzıtıv] *adj* sintetik, süni, sintezə əsaslanan

**compositor** [kəm'pɔzıtə(r)] *n* mürəttib, düzücü *(mətbəədə hərf düzən işçi)*

**composure** [kəm'pouʒə(r)] *n* sakitlik, sükut; səbir, dözüm, soyuqqanlılıq, özünüsaxlama, özünüitirməmə; **to keep / to guard *one's* ~** soyuqqanlılığını/təmkinini saxlamaq; **to act with ~** soyuqqanlı davranmaq/hərəkət etmək; **to lose ~** özündən çıxmaq, səbiri tükənmək

**compote** ['kɔmpout] *n fr.* kompot

**compound**[1] ['kɔmpaund] *n* 1. *fiz., kim.* birləşmə, qarışıq, tərkib; 2. *dilç.* mürəkkəb söz



**compound**[2] ['kɔmpaund] *adj* mürəkkəb; **~ word** *dilç.* mürəkkəb söz; **~ sentence** *qram.* tabesiz mürəkkəb cümlə; **~ predicate** *qram.* mürəkkəb xəbər; **~ fracture** *tib.* ağır sınıq; **~ glass** çoxqatlı şüşə; **~ number** *riyaz.* mürəkkəb adlı ədəd

**compound**[3] [kəm'paund] *v* 1. qarışdırmaq, birləşdirmək, düzəltmək; hazırlamaq; **to ~ a medicine** dərman hazırlamaq /düzəltmək; **to ~ a riddle** tapmaca düzəltmək / fikirləşmək; 2. *hüq.* kompromis razılığa gəlmək *(kreditorla, borc verənlə);* 3. iddia qaldırmaqdan əl çəkmək

**comprehend** [ˌkɔmprı'hend] *v* başa düşmək, dərk etmək; **to ~ a question/a purpose** məsələni/məqsədi başa düşmək; **to ~ the seriousness of the situation** vəziyyətin ciddiliyini başa düşmək; *The child read the story but he did not comprehend its meaning Uşaq hekayəni oxudu, lakin onun mənasını başa düşmədi*

**comprehensibility** [ˌkɔmprıˌhensə'bılətı] *n* asan başa düşülmə, asan anlaşılma, ağlabatma, aydınlıq, inandırıcılıq

**comprehensible** [ˌkɔmprıˌhensəbl] *adj* aydın, başa düşülən, anlaşılan, anlaşıla bilən, ağlabatan, ağlasığan, dərk edilə bilən; **a book that is ~ only to specialists** ancaq mütəxəssislərin başa düşə biləcəyi kitab

**comprehensibleness** [ˌkɔmprı'hensəblnıs] *n* = **comprehensibility**

**comprehension** [ˌkɔmprı'henʃn] *n* 1. anlama, başa düşmə, qanma, anlaq, dərrakə; *It's beyond my comprehension Bunu mən anlamıram/başa düşmürəm; How anyone could behave like that is beyond my comprehension Adam necə belə hərəkət edə bilər, mən anlamıram/başa düşmürəm;* 2. qanacaq, fərasət, anlaq; 3. daxil etmə / edilmə, qavrama, qavranma

**comprehensive** [ˌkɔmprı'hensıv] *adj* 1. qanacaqlı, fərasətli, anlaqlı, zehinli, dərrakəli; 2. ətraflı, mükəmməl, müfəssəl, əsaslı, tam; hər şeyi əhatə edən; **a ~ explanation** ətraflı / mükəmməl / müfəssəl izahat; *The government gave a very comprehensive explanation of its plans for industrial development Hökumət sənayenin inkişafı öz planının ətraflı / müfəssəl izahat verdi;* **~ account** ətraflı /müfəssəl hesabat; **~ description** müfəssəl/ətraflı təsvir; 3. hərtərəfli; hərcəhətli; **~ knowledge** hərtərəfli bilik; **~ disarmament** tam tərksilah; **~ school** ümumtəhsil məktəbi *(İngiltərədə mövcud olan üç növ məktəbi birləşdirən); Our children go to the local comprehensive school Bizim uşaqlar yerli ümumtəhsil məktəbinə gedirlər*

**comprehensiveness** [ˌkɔmprı'hensıvnıs] *n* 1. qanacaqlılıq; fərasətlilik, zehinlilik; 2. ətraflılıq, mükəmməllik, müfəssəllik; 3. əhatəlilik

**compress**[1] ['kɔmpres] *n tib.* kompres *(müalicə məqsədilə ağrıyan yerə qoyulan yaş sarğı)*; **a cold/hot ~** soyuq / isti kompres

**compress**[2] [kəm'pres] *v* sıxmaq, qısmaq, basmaq, əzmək; **to ~ an artery** *tib.* arteriyanı sıxmaq; *In her anger she compressed her lips so tightly that they went white Acığından o, dodaqlarını elə sıxdı ki, onlar dümağ oldu*

**compressed** [kəm'prest] *adj* sıxılmış; **~ air** sıxılmış hava; **~ lips** sıxılmış dodaqlar

**compressibility** [kəmˌpresı'bılıtı] *n* sıxılma qabiliyyəti

**compressible** [kəm'presəbl] *adj* sıxıla bilən, sıxılma qabiliyyəti olan; *Air is a compressible gas Hava sıxıla bilən qazdır*

**compression** [kəm'preʃn] *n* 1. sıxma, sıxılma; yumma, yumulma; sıxlaşdırma, sıxlaşma; bərkimə; qatlaşma; **~ of ideas** fikrin ifadəsinin sıxlaşdırılması; 2. *tex.* kompressiya, sıxma, sıxılma *(qazın motor silindrində sıxılması)*

**compressive** [kəm'presıv] *adj* sıxan, sıxma; **~ force** *fiz.* sıxan qüvvə, sıxma qüvvəsi

**compressor** [kəm'presə(r)] *n* 1. *tex.* kompressor *(havanı, buxarı, qazları sıxmaq üçün maşın);* 2. *tib.* məngənə, sıxac *(operasiya zamanı qan damarını sıxmaq üçün alət);* 3. *dan.* göyərtə tormozu / əyləci

**comprise** [kəm'praız] *v* olmaq, ibarət/var olmaq; əhatə etmək; *His course of study comprises English, French, History and Mathematics Onun təhsil proqramı ingilis dili, fransız dili, tarix və riyaziyyatdan ibarətdir; The examination comprises several tests İmtahan bir neçə testdən ibarətdir; The family comprises five children Ailədə beş uşaq var; The United Kingdom comprises England, Wales, Scotland and Northern Ireland Böyük Britaniya İngiltərə, Uels, Şotlandiya və Şimali İrlandiyadan ibarətdir*

**compromise**[1] ['kɔmprəmaız] *n* kompromis, tərəflərin razılaşması; **to agree to a ~** razılaşmaq, kompromisə gəlmək;

◊ *A lean compromise is better than a fat lawsuit ≅ Dava-dalaşdan bir büküm halva yaxşıdır*

**compromise**[2] ['kɔmprəmaız] *v* 1. kompromisə getmək, razılaşmaq; *We shall have to compromise on this point Bu məsələ barəsində biz kompromisə getməli olacağıq; With much difficulty the dispute was compromised Çox böyük çətinliklə olsa da mübahisə kompromis yolu ilə qaydaya salındı;* 2. etibardan / nüfuzdan / gözdən salmaq, ləkələmək; **to ~ oneself** özünü etibardan/nüfuzdan/gözdən salmaq, özünü ləkələmək; 3. təhlükəyə məruz qoymaq *(vəziyyəti və s.); The position of the whole army was compromised Ordu bütünlüklə təhlükəyə məruz qaldı*

**compromiser** ['kɔmprəmaızə(r)] *n* sazişçi, barışdırıcı *(adam)*

**comprometer** [kəm'prɔmıtə(r)] *n* arifmometr *(hesablama maşını)*

**compulsion** [kəm'pʌlʃn] *n* məcbur / vadar etmə; məcburiyyət; **to act under/upon ~** məcburiyyət altında hərəkət etmək

**compulsive** [kəm'pʌlsɪv] *adj* = **compulsory**
**compulsory** [kəm'pʌlsərɪ] *adj* məcburi, icbari; vacib; ~ **education** icbari təhsil; ~ **subject** məcburi fənn; ~ **payment** məcburi ödəmə; ~ **vaccination** *tib.* məcburi peyvənd/çiçək döymə; ~ **military service** məcburi hərbi mükəlləfiyyət; ~ **exercises** *id.* məcburi təmrinlər; ~ **measures** məcburi / icbari tədbirlər
**compunction** [kəm'pʌŋkʃn] *n* **1.** *(adət. inkar cümlələrdə işlədilir)* vicdan əzabı, peşmanlıq, peşmançılıq; **to have no ~ about doing** *smth.* bir şeyə /işə /hərəkətə görə vicdan əzabı çəkməmək/peşman olmamaq; *That woman didn't have the slightest compunction about telling me a lie Mənə yalan danışdığına görə o qadın əsla vicdan əzabı çəkmədi;* **2.** təəssüf, heyfsilənmə; mərhəmət; **to do** *smth.* **without** ~ bir şeyi təəssüflənmədən/heyfsilənmədən etmək
**compunctious** [kəm'pʌŋkʃəs] *adj* peşman olan, peşmanlıq/peşmançılıq çəkən, vicdan əzabı çəkən
**computable** [kəm'pju:təbl] *adj* hesablana bilən, hesablanan, sayıla bilən, sayılan
**computation** [.kɔmpju:'teɪʃn] *n* **1.** hesablama; **2.** hesab; yekun; **3.** hesablama texnikası
**compute** [kəm'pju:t] *v* hesablamaq, hesab etmək, hesablayıb tapmaq
**computer**[1] [kəm'pju:təʳ] *n* **1.** kompyuter, hesablayan, hesablayıcı maşın; **2.** sayğac, elektron-hesablayıcı maşın - EHM
**computer**[2] [kəm'pju:təʳ] *adj* hesablayıcı; ~ **people** hesablayıcılar; ~ **man** hesablayıcı adam
**computerize, -ise** [kəm'pju:təraɪz] *v* **1.** kompyuterləşdirmək, kompyuterlə təmin etmək; **2.** məlumatları kompyuterə salmaq/kompyuterə yerləşdirmək; *The firm has computerized its records Firma özü haqqında olan məlumatları kompyuterləşdirib / kompyuterə salıb*
**computerization, -isation** [kəm.pju:tərar'zeɪʃn] *n* kompyuterləşdirmə, kompyuterlə təmin etmə
**comrade** ['kɔmrɪd] *n* yoldaş; şərik, kompanyon; **my old ~ of hunting days** köhnə ov/ovçuluq dostum; *Comrades, please be quiet Yoldaşlar, zəhmət olmasa, sakit olun; We must fight for our rights, comrades! Yoldaşlar! Biz öz hüquqlarımız uğrunda mübarizə aparmalıyıq*
**comrade-in-arms** ['kɔmrɪdɪn'a:mz] *n* silah yoldaşı, silahdaş
**comradeship** ['kɔmrɪdʃɪp] *n* yoldaşlıq, yoldaşlıq münasibəti; dostluq
**con**[1] [kɔn] *n* I sükan tutma, sükanı idarə etmə
**con** [kɔn] *n* II *amer.* **confidence** *isminin qısa forması*
**con**[2] [kɔn] *v* I öyrənmək, əzbər öyrənmək; **to ~ (over) a lesson** dərsi əzbər öyrənmək
**con** [kɔn] *v* II təyyarə / gəmi sürmək
**con** [kɔn] *v* **(-nn-)** III *amer. d.d.* aldatmaq, tovlamaq, kələk /hiylə /fırıldaq gəlmək; *You can't con me - you're not really sick! Sən /Siz məni aldada bilməzsən / bilməzsiniz, sən/siz həqiqətən xəstə deyilsən/deyilsiniz; I was conned into buying an old car Məni tovlayıb köhnə maşın aldırdılar; She conned me out $100 O mənə kələk gəlib $100 dollarımı aldı*
**con**[3] [kɔn] *prep* **contra** *sözünün qısa forması*
**concatenate** [kɔn'kætɪneɪt] *v* birləşdirmək, bağlamaq, qoşmaq *(bir-birinə)*, ilişdirmək
**concatenation** [kən.kæt'neɪʃn] *n* **1.** qarşılıqlı əlaqə; ~ **of events / ideas** hadisələr/fikirlər arasında qarşılıqlı əlaqə; **2.** *tex.* enerji mənbəyi; mühərriklər, maşınlar
**concave**[1] ['kɔn'keɪv] *n* **1.** çökük/batıq/çuxur /əyilmiş *(içəri)* səth; **2.** çökük/batıq linza; **3.** *şair.* göy qübbəsi; **4.** *mem.* qübbə, tağ-tavan
**concave**[2] ['kɔn'keɪv] *adj* batıq, çökük; ~ **mirror** çökük / batıq güzgü
**concave**[3] ['kɔn'keɪv] *v* batırmaq, çökəltmək, əymək *(içəri)*
**concavity** [kɔn'kævɪtɪ] *n* **1.** çökük / batıq səth; **2.** çöküklük, batıqlıq, çuxurluq; **3.** çuxur, batıq
**conceal** [kən'si:l] *v* gizləmək, ört-basdır etmək, üstünü basdırmaq; gizli saxlamaq; **to ~ a fugitive** qaçqını gizlətmək; *He did his best to conceal his heavy drinking from his family O, əlindən gələni etdi ki, bərk içdiyini ailəsindən gizlətsin;* **to ~ one's name** əsl adını gizli saxlamaq /bildirməmək; **to ~ one's origin/ignorance/ fear** mənşəyini / nadanlığını / qorxusunu gizlətmək; **to ~ the truth** həqiqəti gizlətmək/ört-basdır etmək; **to ~ oneself** özünü gizlətmək
**concealed** [kən'si:ld] *adj* gizli, örtülü; ~ **wiring** *el.* örtülü məftil, tel
**concealer** [kən'si:ləʳ] *n* gizlədən, ört-basdır edən *(adam)*
**concealment** [kən'si:lmənt] *n* **1.** gizlətmə, gizlində saxlama, ört-basdır etmə; *hüq.* cinayəti/cinayətkarı gizlətmə; cinayəti ört-basdır etmə; **to keep ~** gizlətmək; ~ **of birth** doğum tarixini /gününü gizlətmə; **2.** gizli sığınacaq yeri; **3.** *hərb.* örtülü səngər / sığınacaq, sipər, daldalanacaq; **to seek ~** maskalanma üçün tədbir görmək, gizlənmək
**concede** [kən'si:d] *v* **1.** güzəşt etmək, güzəştə getmək; razılaşmaq, boynuna almaq; **to ~ a point /in an argument** mübahisədə / müəyyən məsələdə güzəştə getmək; **to ~ a right / a privilege** hüququ / imtiyazı güzəştə getmək; *We must not concede any of our territory Biz ərazimizin heç bir qarışını belə güzəştə getməməliyik;* **2.** ehtimal/güman/fərz etmək, mümkün hesab etmək; *Conceding for a moment, that... Bir anlığa güman / fərz / ehtimal etsək ki,...;* **3.** *id.* vermək; **to ~ point** xal vermək
**conceit**[1] [kən'si:t] *n* **1.** şöhrətpərəstlik, şöhrət düşkünlüyü; lovğalıq, təkəbbür; özü haqqında yüksək fikirdə olma; iddia satma, özünü öymə; *The girl is full of conceit Qız çox şöhrətpərəst-dir/şöhrət düşkünüdür;* **to have a great ~ of oneself** özü haqqında yüksək fikirdə olmaq; **2.** uydurulmuş obraz / surət; təhrif edilmiş müqayisə; ◊ **to be out of ~ with** *smb.* / *smth.* bir kəsə / şeyə olan ümidini itirmək
**conceit**[2] [kən'si:t] *v arx.* özü haqqında çox böyük fikirdə olmaq, özündən bədgüman olmaq; uydurmaq, düşünüb/fikirləşib tapmaq
**conceited** [kən'si:tɪd] *adj* **1.** şöhrətpərəst, özündənrazı, iddialı, lovğa, təşəxxüslü, təkəbbürlü, başqalarına xor baxan; **to become ~** lovğalanmaq; *Joan became very conceited after she passed her examinations Coan imtahanlarını verdikdən sonra çox lovğalandı;* **to look ~** iddialı/lovğa/ təkəbbürlü / təşəxxüslü görünmək; *He looks very conceited O çox özündən razı / iddialı/lovğa/təkəbbürlü görünür;* **2.** *d.d.* qəribə, əcaib; ədəbaz, şıltaq *(surət haq.)*
**conceitedly** [kən'si:tɪdlɪ] *adv* şöhrətpərəstcəsinə, təkəbbürlə, təşəxxüslə, özündənrazı bir halda
**conceitedness** [kən'si:tɪdnɪs] *n* şöhrətpərəstlik, təkəbbürlülük, təşəxxüslülük
**conceivable** [kən'si:vəbl] *adj* **1.** ağlabatan, ağlasığan, başa düşülən, ağlaçatan, dərk edilə/oluna bilən; *I suppose it is just conceivable that girl might have helped him escape Məncə, onun xilas olmasına qızın kömək etməsi ağlbatandır; It's conceivable that my wife missed the train, but it's very unlikely Güman ki, mənim arvadım qatara gecikib, lakin bu ağlabatan deyil;* **2.** mümkün olan; **to take every ~ precaution** mümkün olan hər cür ehtiyat tədbiri görmək; **a hotel that offers every ~ luxury** mümkün olan hər cür dəbdəbəyə malik mehmanxana / hotel
**conceivably** [kən'si:vəblɪ] *adv* güman ki, yəqin ki, ehtimal ki
**conceive** [kən'si:v] *v* **1.** başa düşmək, anlamaq, dərk etmək; *I can't conceive where he has gone Mən başa düşə bilmirəm ki, o hara gedib; I can't conceive why you allowed the girls to go alone Mən anlaya bilmirəm, sən / siz qızların tək getməsinə niyə icazə vermisən/vermisiniz;* **2.** duymaq, hiss etmək; **to ~ a dislike for** *smb.* bir kəsə rəğbət bəsləməmək; **to ~ an affection for** *smb.* bir kəsə rəğbət bəsləmək; **3.** fikirləşmək, düşünmək; **to ~ a plan** plan fikirləşmək; **4. (of)** güman / təsəvvür etmək; *We conceive it to be expedient Biz belə hesab edirik ki, bu məqsədəmüvafiqdir; I conceive it my duty to admonish you Mən səni /sizi xəbərdar etməyi öz vəzifəm hesab edirəm; In ancient times the world was conceived of as flat Qədim zamanlarda dünyanın yastı olması fərz edilirdi;* **5.** uşağa qalmaq, hamilə olmaq; *She was told she couldn't conceive Ona dedilər ki, o, hamilə ola bilməz*
**concentrate**[1] ['kɔnsəntreɪt] *n* **1.** konsentrat, zənginləşdirilmiş ərzaq; **2.** şlix *(kənar qatışıqlardan təmizlənmək üçün xəlbirdən keçirilmiş, yuyulmuş qızıl, mis və ya platinli qum);* **copper in ~** mis konsentratı; **3.** *k.t.* zənginləşdirilmiş yem; **4.** yeyinti konsentratı; **an orange ~** portağal konsentratı
**concentrate**[2] ['kɔnsəntreɪt] *v* **1.** toplamaq, yığmaq *(bir yerə),* bir yerə cəmləşdirmək; **to ~ troops** qoşunları bir yerə toplamaq/cəmləşdirmək; *He concentrated the power in his own hands O, hakimiyyəti öz əlində cəmləşdirdi;* **to ~ all one's thoughts/forces / attention** bütün fikrini /qüvvəsini/diqqətini bir yerə cəmləşdirmək /toplamaq; **2.** cəmlənmək, toplanmaq *(bir yerə); The crowds concentrated in the centre of the town Camaat şəhərin mərkəzində bir yerə cəmləşdi / toplaşdı;* **3.** zənginləşdirmək *(filizi);* **4.** qatılaşdırmaq, qəlizləşdirmək
**concentrated** ['kɔnsəntreɪtɪd] *adj* **1.** toplanmış, yığılmış, cəmlənmiş; ~ **fire** *hərb.* bir nöqtədə mərkəzləşdirilmiş atəş; **2.** *kim.* qatılaşdırılmış; **3.** zənginləşdirilmiş *(filiz haq.);* **4.** qatılaşdırılmış *(maye haq.);* **a ~ solution** qatılaşdırılmış maye; **a ~ fruit juice** qatılaşdırılmış meyvə şirəsi
**concentration**[1] [.kɔnsən'treɪʃn] *n* **1.** bir yerə toplama/yığma, toplanma, yığılma *(bir yerə);* **~s of enemy troops** düşmən qoşunlarının bir yerə cəmlənməsi/toplanması; **power of ~** fikrini cəmləşdirmə qabiliyyəti; **a book that requires great powers of ~** diqqətin cəmləşdirilməsini tələb edən kitab; *I found it hard to keep my concentration with so much noise Belə səs-küydə fikrimi cəmləşdirmək mənim üçün çox çətin idi;* **2.** *hərb.* qüvvələrin bir yerə cəmləşdirilməsi/toplanması; atəşi gücləndirmə; **3.** *kim.* mayenin qatılığı; **4.** zənginləşdirmə *(filizi);* **5.** qatılaşdırma *(mayeni)*
**concentration**[2] [.kɔnsən'treɪʃn] *adj:* ~ **camp** hərbi düşərgə *(əsirlərin saxlanıldığı yer);* **Nazi ~ camps** hərbi faşist düşərgələri
**concentrator** ['kɔnsentreɪtəʳ] *n kim.* məhlulun doyma / qatılıq dərəcəsi
**concentre** [kɔn'sentəʳ] *v* **1.** toplamaq, cəmləmək, cəmləşdirmək *(fikri və s.);* **to ~ the mind on one sole object** bütün fikri bir məsələyə cəmləşdirmək / yönəltmək; **2.** ortaq mərkəzə malik olmaq, bir mərkəzə toplanmaq
**concentric** [kɔn'sentrɪk] *adj* konsentrik, ortaq mərkəzli
**concentrical** [kɔn'sentrɪkəl] *adj* = **concentric**
**concentricity** [.kɔnsən'trɪsɪtɪ] *n* topluluq, konsentriklik
**concentual** [kən'sentʃuəl] *adj* ahəngli, həmahəng
**concept** ['kɔnsept] *n* məfhum, anlayış, fikir, ümumi təsəvvür; konsepsiya *(hər hansı bir hadisə haqqında görüş / fikir)*
**conception** [kən'sepʃn] *n* **1.** anlama, dərk etmə, başa düşmə/düşülmə; **beyond one's ~** anlamından kənarda; *I have no conception of what he means Mən onun nə demək istədiyini başa düş-*

*mürəm;* **2.** anlayış, təsəvvür, fikir; *I have no conception (of) why you left home Mənim sənin /sizin evi nə üçün tərk etdiyini/etdiyinizi anlamıram;* **3.** konsepsiya; **his ~ of honour** onun vicdan konsepsiyası; *This conception is current Bu konsepsiya hamı tərəfindən qəbul edilir;* **4.** fikir, niyyət; plan; ideya *(yazıçının, rəssamın, alimin və s.);* **poetic ~** poetik fikir / ideya

**conceptive** [kən'septıv] *adj* başa düşülə bilən, başadüşülən

**conceptual** [kən'septʃuəl] *adj* **1.** anlama, dərketmə; **2.** mücərrəd, abstrakt

**conceptualism** [kən'septʃuəlızm] *n fəls.* konseptualizm *(insan ağlında ümumi təsəvvürlərin mövcud olduğunu qəbul edən orta əsr fəlsəfi cərəyanı)*

**concern[1]** [kən'sə:n] *n* **1.** yanaşma; əlaqə / münasibət göstərmə; münasibət; dəxli olma; **to have no ~ with** heç bir əlaqəsi / dəxli olmamaq; *It's no concern of mine Bunun mənə dəxli yoxdur; What concern is it of yours? Bunun sənə / sizə nə dəxli var? The fact that you have left your wife isn't my concern Sənin / Sizin arvadını / arvadınızı atıb getməyinin / getməyinizin mənə dəxli yoxdur;* **2.** narahatlıq; həyəcan, təlaş, nigaranlıq; qeydinə qalma; qayğı; **to show ~ for an invalid** əlilin qeydinə qalmaq; **a nurse's ~ for a sick man** dayənin xəstəyə qayğısı; **to express deep ~** böyük təlaş/narahatlıq göstərmək; **to feel ~ about** *one's* **future** gələcəyi haqqında narahatlıq/təlaş/nigaranlıq keçirmək; **to feel no ~ for** *smth.* bir şeyə laqeydlik göstərmək, bir şey üçün narahatlıq / təlaş keçirməmək; **to cause ~** həyəcan / narahatlıq yaratmaq; *There is no cause for concern Narahatlığa səbəb yoxdur;* **3.** maraq, iştirak etmə; **4.** firma, müəssisə; **paying ~** gəlirli/gəlir verən müəssisə; **to have a ~ in a business** hər hansı bir işdə marağı olmaq; *Our concern only makes shoes for children Bizim firma ancaq uşaqlar üçün ayaqqabı tikir / buraxır;* **5.** vaciblik; məna; **matter of great ~** çox vacib məsələ; **6.** *pl* işlər; **meddling in** *smb.'s* **~s** bir kəsin işlərinə qarışma; **7.** *d.d.* zarafat, hənək; **8.** pay; *He has a small concern in our business Onun bizim biznesdə bir balaca payı var*

**concern[2]** [kən'sə:n] *v* **1.** aid / dəxli olmaq; *That doesn't concern you at all Bunun əsla / qətiyyən sənə / sizə dəxli yoxdur; He is said to have been concerned in the crime/in the conspiracy Deyirlər ki, onun cinayətdə / sui-qəsddə əli var;* **2.** narahat olmaq, qeydinə qalmaq; **to be ~ed about** *one's* **health** öz sağlamlığının qeydinə qalmaq; **to be ~ed about the future** gələcək haqqında narahat olmaq; **3.** narahat etmək, incitmək; təşvişə salmaq, iztirab vermək, qorxutmaq; *Don't let my illness concern you Qoy mənim xəstəliyim səni / sizi narahat etməsin;* **4.** maraqlanmaq, məşğul olmaq; **to ~ oneself with literature/with politics** ədəbiyyatla / siyasətlə maraqlanmaq, ədəbiyyatla/siyasətlə məşğul olmaq;

◊ *As far as I am concerned... Mənə gəldikdə...*

**concerned** [kən'sə:nd] *adj* **1.** aid/dəxli olan *(bir şeyə),* əlaqəli; **to be ~ with** bəhs etmək, haqqında olmaq; *This story is concerned with fairies and wicked magicians Bu hekayə sehrbazlar və qəddar cadugərlərdən bəhs edir;* **2.** narahat, qayğılı, əndişəli; təşvişli; *I am very concerned about my mother's illness Anamın xəstəliyi məni çox narahat edir;* **to have a ~ look** təşviş / narahatlıq ifadə edən görkəmə malik olmaq

**concerning** [kən'sə:nıŋ] *prep.* aid, haqqında, barəsində, dair; *Concerning your letter I can say nothing, because I haven't got it yet Sənin / Sizin məktubun / məktubunuz haqqında mən heç bir şey deyə bilmərəm, çünki mən onu hələ almamışam*

**concert[1]** ['kɔnsə:t] *n* **1.** konsert; **to give a ~** konsert vermək; **2.** həmrəylik, birlik, yekdillik; **in ~ with** birgə, bir yerdə, əlaqədə, birlikdə, əlbir *(olaraq); The various governments decided to act in concert over this matter Müxtəlif hökumətlər bu məsələ barədə birgə/əlbir hərəkət etməyi qərara aldılar*

**concert[2]** ['kɔnsət] *adj* **1.** konsert; **~ hall** konsert zalı; **~ grand** konsert royalı; **~ music** konsert musiqisi

**concert[3]** [kən'sə:t] *v* razılaşmaq, sazişə gəlmək, düzəlişmək, şərtləşmək, sözləşmək, dilbir olmaq, razılığa gəlmək; **to ~ on method** metod haqqında razılığa gəlmək

**concerted** [kən'sə:tıd] *adj* uyğunlaşdırılmış; razılaşdırılmış; yekdil, birgə; **to take ~ action** yekdil hərəkət etməyə təşəbbüs göstərmək

**concert-goer** ['kɔnsətgouə^r] *n* konsert həvəskarı *(xüs. klassik musiqi konserti)*

**concertina[1]** [.kɔnsə'ti:nə] *n* **1.** konsertino *(altıbucaqlı qarmon);* **2.** konsert *(orkestrin müşayiəti ilə tək bir musiqi aləti və ya oxuyan tərəfindən ifa olunmaq üçün böyük musiqi əsəri)*

**concertina[2]** [.kɔntʃə'ti:nou] *v (pt, pp* **concertinaed;** *pr.p* **consertinaing)** qarmon kimi sıxılmaq/yığılmaq; *The truck creshed into the tree and concertinaed Yük maşını ağaca çırpıldı və qarmon kimi əzildi*

**concertmaster** ['kɔnsət.ma:stə^r] *n amer.* konsertmeyster *(orkestrdə ifaçılar dəstəsinin rəhbəri)*

**concerto** [kən'tʃə:tou] *n (pl* **-os** [-ouz]) konsert *(musiqi əsəri);* **a piano ~** piano üçün musiqi əsəri; **a ~ for two violins** iki skripka üçün musiqi əsəri

**concession** [kən'seʃn] *n* **1.** güzəşt etmə; güzəştə getmə; güzəşt; **~ to public opinion** ictimai fikrə güzəştə getmə; **to make ~s** güzəşt etmək; **by mutual ~** qarşılıqlı güzəşt vasitəsi/yolu ilə; **2.**



konsessiya *(ölkə daxilində sənaye müəssisələri təşkil etmək, mədən çıxarmaq və s. üçün dövlət tərəfindən ayrı-ayrı şəxslərə, şirkətlərə və ya başqa dövlətə verilən hüquq);* **foreign ~** xarici konsessiya; **to grant ~s** konsessiya vermək

**concessionaire** [kən.seʃə'neə^r] *n* konsessiya verilən adam / şəxs

**concessive** [kən'sesıv] *adj* **1.** güzəştə gedən, tez razılaşan, yolayaxın, yolayovuq; **2.** *qram.* güzəşt; **~ clause** güzəşt budaq cümləsi

**conch** [kɔntʃ] *n zool.* **1.** mollyusk *(onurğasız yumşaqbədənli heyvan);* **2.** balıqqulağı

**concha** ['kɔŋkə] *n anat.* qulaq seyvanı

**conciliate** [kən'sılıeıt] *v* **1.** *(to, for)* etimad / məhəbbət və s. qazanmaq, dostluq yaratmaq; **2.** sakitləşdirmək, sakit / rahat / təskin etmək; **3.** barışdırmaq, razılaşdırmaq; *The government is mainly concerned to conciliate public opinion İctimai fikri barışdırmaq başlıca olaraq dövlətə aiddir / dövlətin işidir*

**conciliation** [kən.sılı'eıʃn] *n* barışdırma, barışma, barışıq, sakitləşdirmə, sakitləşmə; *She ignored the man's attempts at conciliation O, kişinin barışdırmaq işindəki səylərini nəzərə almadı*

**conciliative** [kən'sılıətıv] *adj* = **conciliatory**

**conciliator** [kən'sılıeıtə^r] *n* barışdırıcı; sülh yaradan *(adam)*

**conciliatory** [kən'sılıətrı] *adj* barışdırıcı, sakitləşdirici; **~ measures** barışdırıcı / sakitləşdirici tədbirlər; **~ act** barışdırıcı / sakitləşdirici hərəkət; **~ smile** sakitləşdirici təbəssüm; **~ tone** sakitləşdirici ton

**concilium** [kən'sılıəm] *n (pl* **-lia**) konsilium *(ağır xəstəliyi və onun müalicə üsullarını müəyyən etmək üçün bir neçə həkimin müşavirəsi)*

**concise** [kən'saıs] *adj* qısa, yığcam; qısaldılmış; **a ~ dictionary** qısa lüğət; **a ~ summary** yığcam icmal; **clear and ~ instructions** aydın və qısa təlimatlar; *His observations were concise and to the point Onun müşahidələri yığcam və məqsədyönlü idi*

**concisely** [kən'saıslı] *adv* qısa, yığcam, ifadəli; **to speak ~** qısa/yığcam danışmaq

**conciseness** [kən'saısnıs] *n* qısalıq, yığcamlıq; ifadəlilik

**conclave** ['kɔnkleıv] *n* gizli müşavirə/iclas; **to sit / to meet in ~** gizli müşavirə / iclas keçirmək; **a ~ of judges** hakimlərin gizli müşavirəsi / iclası

**conclude** [kən'klu:d] *v* **1.** qurtarmaq, bitirmək, tamamlamaq, başa çatdırmaq; **to ~ a lecture / a chapter / a letter / a dictation / an argument, etc.** mühazirəni / fəsli / məktubu/imlanı/mübahisəni və s. qurtarmaq /başa çatdırmaq /bitirmək; **to ~ a sitting/a meeting** iclası / yığıncağı bitirmək /qurtarmaq; *He concluded his address with a poem O, nitqini şerlə qurtardı / tamamladı;* **2.** başa çatmaq, tamamlanmaq; *The meeting concluded unexpectedly İclas gözlənilmədən qurtardı /başa çatdı;* **3.** bağlamaq, imzalamaq; **to ~ a treaty** müqavilə bağlamaq; **4.** nəticəyə gəlmək; nəticə çıxartmaq; *What do you conclude from his behaviour? Onun hərəkətindən / davranışından sən/siz nə nəticə çıxardırsan / çıxardırsınız?* **5.** qərar qəbul etmək *(bir iş görmək üçün);* qərara almaq; *It was concluded to bring him to trial Qərara alındı ki, onu məhkəməyə cəlb etsinlər; The jury concluded that she was guilty Jüri qərara aldı ki, o, günahkardır*

**concluding** [kən'klu:dıŋ] *adj* son, axır; **~ speech** son söz / nitq

**conclusion** [kən'klu:ʒn] *n* **1.** son, axır; *I found the conclusion of this book very interesting indeed Həqiqətən də bu kitabın axırı mənə çox maraqlı gəldi;* **2.** nəticə; **the ~ of a speech/investigation /observation** nitqin/tədqiqatın/müşahidənin nəticəsi; **to bring to a ~** sona çatdırmaq, başa vurmaq, qurtarmaq; **to draw a ~** nəticə çıxartmaq; **to arrive at/to reach a ~** nəticəyə gəlmək; **to jump to/at a ~, to rush to a ~** tələsik nəticə çıxartmaq; **3.** *hüq.* hakimin qərarı; **3.** imzalama; bağlama; **the ~ of a treaty** sazişin imzalanması; ◊ **to try ~s with** *smb.* bir kəslə mübahisəyə girmək / girişmək

**conclusive** [kən'klu:sıv] *adj* **1.** son, axır; **2.** həlledici, qəti; **2.** inandırıcı, qaneedici, əsaslı; **~ evidence** əsaslı/ inandırıcı sübut

**conclusively** [kən'klu:sıvlı] *adv* **1.** qəti, qəti surətdə, qəti olaraq, tamamilə, bütünlüklə; **2.** cəsarətlə, əzmlə, mətanətlə, qətiyyətlə; **3.** inandırıcı surətdə, əsaslı olaraq

**conclusiveness** [kən'klu:sıvnıs] *n* inandırıcılıq, sübutluluq, əsaslılıq, dəlillilik

**concoct** [kənkɔkt] *v* **1.** bişirmək *(xörək: əl altında olan müxtəlif ərzaqlardan),* hazırlamaq *(yemək, içki); Although there was little food in the house, Jane concocted a splendid meal Baxmayaraq ki, evdə azuqə az idi, Ceyn əla bir yemək hazırladı;* **2.** uydurmaq, qondarmaq, düzəltmək, quraşdırmaq; **to ~ a story/an excuse/a plot for a novel** əhvalat/bəhanə/roman üçün süjet uydurmaq/fikirləşmək; *John concocted an excuse for being late and the teacher believed him Con gecikməyinə bir bəhanə uydurdu və müəllim ona inandı*

**concoction** [kən'kɔkʃn] *n* **1.** biş-düş, bişir-düşür, bişirmə, hazırlama *(yemək, içmək haq.);* ayından-oyundan bişirilmiş yemək / içmək, xəlitə; *Do you expect me to drink this vile concoction Sən / Siz gözləyirsən ki, /gözləyirsiniz ki, mən bu iyrənc xəlitəni içim?;* **2.** uydurma, özündən düzəltmə *(hekayə, plan, intriqa və s.); His affidavit was a concoction from beginning to end Onun ifadəsi əvvəldən axıra kimi uydurma idi;* **3.** konsentrat; qatılaşma

**concomitant[1]** [kən'kɔmıtənt] *n* yanaşı gedən/ olan vəziyyət; *Sleeplessness is often a con-*

*comitant of anxiety Narahatçılıq çox vaxt yuxusuzluq doğurur /yaradır*

**concomitant²** [kən'kɔmıtənt] *adj* müşayiət edən; əlaqədar; eyni vaxtda baş verən; **travel and all its ~ discomforts** səyahət və onunla əlaqədar narahatçılıqlar

**concord¹** ['kɔŋkɔ:d] *n* **1.** razılıq, dostluq, dinclik, dostluq / dinclik şəraiti; **to live in ~** dinclik /dostluq şəraitində yaşamaq; *The two tribes had lived in concord for many years Bu iki qəbilə uzun illər dinclik /dostluq şəraitində yaşadı;* **2.** saziş; *Both sides willingly signed the concord which ended the disagreement between them Hər iki tərəf məmnuniyyətlə saziş imzaladı və bu da onlar arasındakı narazılığa son qoydu;* **3.** *qram.* uzlaşma; *There must be concord between a verb and its subject Fellə onun mübtədası arasında uzlaşma olmalıdır;* **4.** *mus.* ahəng, harmoniya, həmahənglik, səs uyğunluğu

**concord²** ['kɔnkɔ:d] *v* razılaşmaq, sazişə /razılığa gəlmək; dilbir / əlbir olmaq

**concordance** [kən'kɔ:dəns] *n* **1.** müqavilə, razılıq; harmoniya, həmahənglik, müvafiqlik; **in ~ with your wishes** sənin / sizin arzuna / arzunuza müvafiq olaraq; **2.** kitablarda təsadüf edilən əlifba göstəricisi; **~ of Shakespeare** Şekspir əsərlərinə aid olan əlifba göstəricisi

**concordant** [kən'kɔ:dənt] *adj* **1.** razı, mütabiq, müvafiq, uyğun; müvafiq/uyğun olan; harmonik; **~ with wishes** arzulara müvafiq / uyğun olaraq; **~ with the dictates of his professional code** peşə etikasına uyğun/müvafiq olan; **2.** *mus.* ahəngdar, həmavaz, uyğun olan

**concordantly** [kən'kɔ:dəntlı] *adv* mehribanlıqla, dostcasına, dostluqla, səmimiyyətlə; müvafiq / uyğun olaraq

**concordat** [kɔn'kɔ:dæt] *n məsələləri qaydaya salmaq üçün kilsə ilə dövlət arasında bağlanılan saziş / müqavilə*

**concourse** ['kɔŋkɔ:s] *n* **1.** toplaşma, yığışma, bir yerə yığışma *(adam və s. haq.);* izdiham; *The whole admiring concourse gazed on him Bütün toplaşan adamlar ona məftunluqla baxırdılar;* **2.** publikanın toplaşdığı yer və ya zal; **3.** bir neçə cığırın/ yolun/ küçənin birləşdiyi yer; **4.** *amer.* əsas vestibül, zal *(vağzalda və s.)*

**concrete¹** ['kɔnkri:t] *n* beton

**concrete²** ['kɔnkri:t] *adj* I beton, betondan qayrılmış; **reinforcement ~** beton armaturu

**concrete** ['kɔnkri:t] *adj* II konkret; **~ fact** konkret fakt/ dəlil; **~ noun** *qram.* konkret isim; **~ thought** konkret fikir; **~ blockhouse** *hərb.* betonlanmış/betondan tikilmiş dot *(istehkam)*

**concrete³** ['kɔnkri:t] *v* betonlamaq, beton tökmək, betonla bərkitmək; **to ~ a road** yolu betonlamaq, yola beton tökmək; *The workman is still busy concreting the road Fəhlə hələ də yolu betonlamaqla / yola beton tökməklə məşğuldur*

**concrete-mixer** ['kɔnkri:t'mıksə^r] *n* betonqarışdıran

**concreting** ['kɔnkri:tıŋ] *n* betonlama, beton tökmə

**concretion** [kən'kri:ʃn] *n* **1.** bitişmə, qovuşma; bitişdirmə, birləşdirmə, qovuşdurma; **2.** bərkimə, qatılaşma; **4.** *tib.* konkrement *(bədən boşluqlarında və ya toxumalarında əmələ gələn daş)*

**concretize, -ise** ['kɔnkri:taız] *v* konkretləşdirmək

**concubinage** [kɔn'kju:bınıdʒ] *n* konkubinat *(müvəqqəti, nikahsız yaşama)*

**concubine** ['kɔŋkjubaın] *n* **1.** məşuqə; kəniz; **2.** kiçik arvad *(çoxarvadlılığa icazə verilən ölkələrdə); The king had 4 wives and 20 concubines Kralın 4 arvadı və 20 kənizi vardı; The sultan's wives and concubines live in the harem Sultanın arvadları və kənizləri hərəmxanada yaşayırlar*

**concupiscence** [kən'kju:pısəns] *n* şəhvət hissi / arzusu; ehtiras; şəhvətpərəstlik; şiddətli arzu

**concupiscent** [kən'kju:pısənt] *adj* şəhvətli, ehtiraslı; həvəsli; şəhvətpərəst

**concur** [kən'kə:^r] *v* **1.** uyğun gəlmək/olmaq, üst-üstə düşmək; *Our opinions on this matter concur Bu məsələdə bizim fikirlərimiz uyğun gəlir / üst-üstə düşür;* **2.** razılaşmaq, fikri uyğun gəlmək; *I concur with the speaker in this respect Bu barədə mən natiqlə razıyam /razılaşıram*

**concurrence** [kən'kʌrəns] *n* **1.** uyğun gəlmə / olma, düz gəlmə; üst-üstə düşmə; **~ of ideas /opinions** fikirlərin / rəylərin uyğun gəlməsi / üst-üstə düşməsi; **2.** birlik, müvafiqlik, uzlaşma; yekdillik *(fikir haq.)*

**concurrent** [kən'kʌrənt] *adj* **1.** uyğun gələn / olan; eyni vaxtda baş verən / mövcud olan; **the ~ existence of two different systems** iki müxtəlif sistemin eyni vaxtda mövcud olması; **the ~ views of several experts** bir neçə ekspertin uyğun gələn /yekdil fikri/rəyi; **2.** *riyaz.* kəsişən; **~ lines** kəsişən xətlər

**concuss** [kən'kʌs] *v* **1.** sarsıtmaq; zərbə endirmək, vurmaq; məğlub etmək; **2.** hədə-qorxu gəlməklə məcbur/vadar etmək *(bir iş görməyə);* **3.** *tib.* silkələnməyə səbəb / bais olmaq *(beyin haq.)*

**concussion** [kən'kʌʃn] *n* **1.** silkələnmə, sarsıtma, silkələmə; sarsıntı; **~ of the brain** beyin sarsıntısı/silkələnməsi; *He's suffering from concussion after falling out of a window Pəncərədən yıxıldıqdan sonra aldığı beyin sarsıntısından/silkələnməsindən o, əziyyət çəkir;* **2.** *tib.* kontuziya *(dəriyə zərər vermədən, orqanizmdə əmələ gələn zədə);* **3.** *hüq.* hədə və ya təzyiq vasitəsilə məcbur etmə

**condemn** [kən'dem] *v* **1.** qınamaq, töhmətləndirmək, pisləmək, məzəmmət etmək; **to ~ a person for his conduct** bir şəxsi hərəkətinə görə qınamaq / pisləmək; *We all condemn cruelty to children Biz hamımız uşaqlara qarşı qəddarlığı pisləyirik;* **2.** *hüq.* günahkar hesab etmək, həbs / məhkum etmək, iş kəsmək; **to ~ to death**



ölümə məhkum etmək; *The prisoner was condemned to death Dustaq ölümə məhkum edildi;* **to ~ to imprisonment** iş kəsmək, həbsxanaya salmaq; *He was condemned and imprisoned in a day Onu günahkar bildilər və bir günlüyə həbsə saldılar;* **3.** brak etmək, yararsız / zay hesab etmək; *The meat was condemned as unfit for food Ət yemək üçün yararsız hesab edildi;* **4.** müsadirə etmək, həbs qoymaq *(xüs. gəmiyə);* zəbt/müsadirə etmək, almaq *(zorla);* **5.** ifşa etmək, cinayət başında tutmaq, meydana çıxartmaq; açmaq, bildirmək, aşkar/məlum etmək; ələ vermək; *Her looks condemn her Görünüşü onu ələ verir/ifşa edir;* **6.** möhkəm /bərk/kip mıxlamaq *(qapını, pəncərəni)*

**condemnation** [ˌkɔndem'neıʃn] *n* **1.** məzəmmət, töhmət; **2.** hökm, ittihamnamə; **3.** müsadirə; həbs qoyma *(bir şey üzərinə);* zəbt etmə

**condemnatory** [kən'demnətərı] *adj hüq.* ittihamedici, ittiham

**condemned** [kən'demd] *adj* **1.** məhkum edilmiş, pislənmiş, qınanmış; **2.** brak / yararsız / zay hesab edilmiş

**condemned cell** [kənˌdemd'sel] *n* ölümə məhkum edilmiş dustaqların saxlanıldığı kamera

**condensable** [kən'densəbl] *adj* qatılaşa / qəlizləşə bilən

**condensation** [ˌkonden'seıʃn] *n* **1.** kondensasiya; qəlizləşmə, qatılaşma; sıxlaşma, sıxlaşdırma; suya çevrilmə; **~ of steam to water** buxarın suya çevrilməsi; **2.** buxar suya çevrilərkən əmələ gələn damcı; *There was a lot of condensation on the window Pəncərədə çoxlu su damcıları vardı;* **3.** yığcamlıq, qısalıq, müxtəsərlik *(üslub haq.)*

**condense** [kən'dens] *v* **1.** kondensasiya etmək; qəlizləşdirmək; suya çevirmək; **2.** kondensasiya olunmaq, qəlizləşmək; suya çevrilmək; **3.** qısa/yığcam şəkildə ifadə etmək *(fikri və s.)*

**condensed** [kən'denst] *adj* **1.** kondensasiya edilmiş/vasitəsilə alınmış; qatılaşdırılmış, qəlizləşdirilmiş; **~ milk** qatılaşdırılmış / qəlizləşdirilmiş süd; **2.** qısa, sıxılmış; **~ account of an event** hadisənin qısa şərhi / izahı

**condenser** [kən'densə^r] *n* **1.** *tex.* kondensator *(buxarı sıxlaşdıran aparat);* **2.** *fiz.* kondensor *(şüaları toplayıb bir istiqamətə yönəldən optik şüşə)*

**condensery** [kən'densərı] *n* qatılaşdırılmış süd istehsal edən zavod

**condensible** [kən'densəbl] *adj* = **condensable**

**condensity** [kən'densıtı] *n* qısalıq, müxtəsərlik, yığcamlıq

**condescend** [ˌkɔndı'send] *v* **1.** iltifat / mərhəmət göstərmək, özünə rəva bilmək; lazım bilmək; *The general condescended to eat with the soldiers General iltifat göstərərək əsgərlərlə yemək yedi;* **2.** alçalmaq, özünü alçaltmaq

**condescending** [ˌkɔndı'sendıŋ] *adj* mərhəmətli, iltifatlı, yumşaq; təkəbbürlü; **naughty and ~ manner** dəcəl və təkəbbürlü xasiyyət

**condescension** [ˌkɔndı'senʃn] *n* mərhəmət, iltifat; güzəşt; yumşaqlıq, rəhmdillik; təkəbbürlülük

**condign** [kən'daın] *adj* layiq; ləyaqətli; **~ censure /punishment** layiqli məzəmmət / cəza

**condiment** ['kɔndımənt] *n* **1.** xuruş, sous; **2.** ədva; *Pepper and salt are condiments İstiot və duz ədvadır*

**condition¹** [kən'dıʃn] *n* **1.** vəziyyət, hal; **to be in good / bad / terrible ~** yaxşı / pis / dəhşətli vəziyyətdə olmaq; *This car/ship / boat, etc. is in good condition, but that car is in bad condition Bu maşın / gəmi / qayıq yaxşı vəziyyətdədir, lakin o maşın pis vəziyyətdədir; The house is in a terrible condition Ev dəhşətli vəziyyətdədir; The goods arrived in good / bad condition Mal yaxşı / pis vəziyyətdə gəlib çatdı;* **in good ~** yararlı vəziyyətdə; **to be in/ tp be out of ~** yaxşı/pis vəziyyətdə olmaq *(xüs. sağlamlıq haq.); The patient is in a critical condition Xəstə kritik/çox ağır vəziyyətdədir; He is in no condition to travel O, səyahət edə biləcək vəziyyətdə deyil (yəni səhhəti imkan vermir);* **~ of the market** bazarın vəziyyəti; **2.** *pl* şərait; **~s of the life/living ~s** yaşayış/həyat şəraiti; **to better/to amend ~s** şəraiti yaxşılaşdırmaq *(əmək şəraiti və s. haq.);* **climatic ~s** iqlim/hava şəraiti; **the ~s of weightlessness** çəkisizlik şəraiti; *The astronauts soon got used to the conditions of weightlessness Astronavtlar tezliklə çəkisizlik şəraitinə alışdılar/öyrəşdilər;* **3.** şərt, qeyd-şərt; **to meet the ~s** şərti yerinə yetirmək; **to lay down ~s** şərti bəyan etmək, şərt qoymaq; **~s of sales/of payment** satış / ödəmə şərtləri; **on / upon ~ (that) ...** bu şərtlə: *On what condition will you agree? Sən/Siz hansı şərtlə razılaşacaqsan/razılaşacaqsınız?* **4.** *hüq.* klauzula *(müqavilədə ayrıca maddə, şərt və ya qeyd);* **5.** ictimai mövqe / yer/rol; **to be of high/low ~** cəmiyyətdə yüksək / aşağı mövqe tutmaq; **men of all ~s, people of every ~ of life** yüksək vəzifəli adamlar; to **change** *one's* **~** vəziyyətini dəyişmək *(yəni evlənmək, yaxud ara getmək);* **6.** *qram.* şərt budaq cümləsinin şərt bildirən hissəsi; **real/unreal ~**real / qeyri-real şərt

**condition²** [kən'dıʃn] *v* **1.** *(Çox vaxt məchulda işlənir)* şərtləşmək, səbəb olmaq, müəyyənləşdirmək; nizama/qaydaya salmaq; tənzim etmək; *The size is conditioned by the requirements Ölçü tələblə müəyyən edilir/müəyyənləşir;* **2.** *k.t.* bordaqlamaq, kökəltmək; **3.** *id.* komandanı və ya atı məşq etdirmək; **4.** normaya /standarta salmaq *(havanı);* **5.** şərt qoymaq, şərtləşdirmək

**conditional** [kən'dıʃənl] *adj* **1.** şərt, şərti; şərtli, şərtləşdirilmiş; **to be ~ on** *smth.* hər hansı bir şərtdən asılı olmaq; **~ promise** şərti öhdəlik; **2.**

*gram.* şərt; ~ **sentence** şərt budaq cümləsi; ~ **mood** şərt şəkli *(felin)*
**conditionally** [kən'dɪʃnəlɪ] *adv* şərti olaraq, şərti
**conditioned** [.kən'dɪʃnd] *adj* 1. şərti; ~ **reflex** şərti refleks; 2. standarta cavab verən, kondisiyaya uyğun
**condole** [kən'doul] *v* 1. başsağlığı vermək; *I condole with you upon the loss of your mother Ananın/Ananızın ölümü ilə əlaqədar olaraq sənə/sizə başsağlığı verirəm;* 2. *arx.* göz yaşı axıtmaq / tökmək, ağlamaq, yas / yasını tutmaq; dərdinə şərik olmaq; qüssələnmək, kədərlənmək
**condolence** [kən'douləns] *n (çox vaxt pl)* başsağlığı, başsağlığı vermə; **to present** *one's* **~s to** *smb.* bir kəsə başsağlığı vermək; *Please accept my condolences on your father's death Atanın/Atanızın ölümü ilə əlaqədar lütfən mənim başsağlığımı qəbul et/edin;* **a letter of** ~ başsağlığı məktubu
**condom** ['kɔndəm] *n* prezervativ, kondom *(qadını hamiləlikdən və özünü isə cinsi əlaqədə olarkən xəstəlikdən qorumaq üçün kişilərin cinsi orqanına geydiyi rezin qoruyucu)*
**condonation** [.kɔndou'neɪʃn] *n* unutma, yaddan çıxarma, bağışlama, günahından / təqsirindən / suçundan keçmə *(cinayət və s. haq.)*
**condone** [kən'doun] *v* 1. bağışlamaq *(cinayəti və s.);* 2. *hüq.* ər-arvad arasındakı vəfasızlığı bağışlamaq
**condor** ['kɔndɔ:] *n zool.* kondor *(Cənubi Amerikanın dağlıq yerlərində yaşayan çox iri yırtıcı quş)*
**conduce** [kən'dju:s] *v* kömək etmək, imkan yaratmaq, səbəb olmaq *(bir şeyə);* **to ~ to success** müvəffəqiyyətə kömək etmək /səbəb olmaq / imkan yaratmaq; **to ~ to health** sağlamlığa kömək etmək
**conducive** [kən'dju:sɪv] *adj* imkan yaradan, kömək edən, səbəb olan; əlverişli; yararlı; *Early rising is conducive to health Erkən durmaq (yuxudan) sağlamlığa kömək edir/səbəb olur;* **~ to appetite** iştaha açan /gətirən, iştahaya səbəb olan
**conduct[1]** ['kɔndəkt] *n* 1. əxlaq; rəftar; davranış; **good ~** yaxşı əxlaq/davranış; **bad ~** pis əxlaq / davranış / rəftar; **examplary ~** nümunəvi əxlaq/davranış/rəftar; **irreproachable ~** qüsursuz əxlaq/rəftar/davranış; **the rules of ~** əxlaq qaydaları; **to observe the rules of ~** əxlaq qaydalarına riayət etmək; 2. idarə etmə, rəhbərlik / başçılıq etmə; rəhbərlik, başçılıq; **~ of a business** işə rəhbərlik / başçılıq etmə; **~ of war** müharibəni idarə etmə; *There was growing criticism of the government's conduct of the war Dövlətin müharibə aparma tərzinin tənqidi günbəgün artırdı;* **~ of fire** *hərb.* atəşi idarə etmə; 3. *arx.* ötürmə, yola salma, müşayiət etmə
**conduct[2]** [kən'dʌkt] *v* 1. aparmaq *(dərs, iclas və s.);* başçılıq / idarə etmək; **to ~ a meeting** iclas aparmaq; **to ~ negotiations** danışıqlar aparmaq; **to ~ an expedition** ekspedisiyaya başçılıq etmək; **to ~ business** işə başçılıq etmək, işi idarə etmək; *She was appointed to conduct the advertising campaign Onu reklam kampaniyasına başçı təyin etdilər;* 2. *dirijorluq etmək; A concert by the philharmonic Orchestra was conducted by Sir Colin Davis Filarmoniya orkestrinin konsertinə ser Kolin Davis dirijorluq etdi;* 3. müşayiət etmək, göstərmək; *A guide conducted us round the museum Bələdçi muzeydə bizi müşayiət etdi;* 4. davranmaq; **to ~ oneself** özünü aparmaq; *He conducts himself well O özünü yaxşı aparır; How did the prisoner conduct himself? Dustaq özünü necə apardı?;* **to ~ oneself honourably/with dignity like a gentleman** özünü alicənabcasına/ləyaqətlə/centlmen kimi aparmaq; 5. *el.* keçirmək *(istilik, elektrik); Plastic and rubber won't conduct electricity Kauçuk və rezin elektrik keçirmir;* 6. konduktor işləmək; *She's conducted on London buses for 20 years İyirmi ildir o, London avtobusunda konduktor işləyir*
**conductance** [kən'dʌktəns] *n fiz.* elektrik nəqletmə qabiliyyəti, keçiricilik qabiliyyəti
**conductibility** [kən'dʌktɪbɪlɪtɪ] *n* = **conductance**
**conduction** [kən'dʌkʃn] *n* 1. *fiz.* keçiricilik qabiliyyəti / xassəsi; **~ of heat** istilikkeçirmə xassəsi / qabiliyyəti; 2. keçirmə *(suyu boru ilə və s.)*
**conductive** [kən'dʌktɪv] *adj fiz.* keçirən; **~ body** keçirici, naqil
**conductivity** [.kɔndʌk'tɪvɪtɪ] *n fiz.* 1. keçirmə əmsalı; 2. elektrik nəqletmə qabiliyyəti; **the low ~ of lead** qurğuşunun aşağı dərəcəli keçiricilik qabiliyyəti
**conductor** [kən'dʌktə'] *n* 1. konduktor *(avtobusda, tramvayda);* 2. *amer. d.y.* bələdçi; konduktor *(vaqonda);* 3. gid, bələdçi, rəhbər; **~ of a party** qrupun bələdçisi; 4. dirijor; 5. *fiz.* keçirici; məftil; 6. elektrik siperi / ötürücüsü
**conductress** [kən'dʌktərɪs] *n* avtobus konduktoru *(qadın: Britaniyada)*
**conduit** ['kɔndjuɪt] *n* 1. boru kəməri; su borusu *(yeraltı);* akveduk *(çay, dərə və s. üzərindən çəkilən su kəməri);* 2. *fiz.* izolə edilmiş boru; 3. yeraltı keçid, gizli yol; 4. kanal, yol
**cone[1]** [koun] *n* 1. *riyaz.* konus; **~ of rays** *fiz.* şüa dəstəsi; 2. ağzı genlik, qıfa bənzərlik; ucluq; 3. qoza *(iynəyarpaqlı ağaclarda);* 4. konusabənzər bir şey; 5. pik, konus *(vulkanda);* 6. balaca stəkan *(dondurma üçün)*
**cone[2]** [koun] *v* konus formasına salmaq
**confect** [kən'fekt] *v* 1. şirniyyat hazırlamaq / bişirmək; 2. konservləşdirmək, konserv hazırlamaq; marinad / turşu qoymaq; 3. qayırmaq, hazırlamaq, düzəltmək
**confection[1]** [kən'fekʃn] *n* 1. şimi qatmaqla xörək və s. hazırlama; 2. dərman hazırlama; 3. qənnadı malları, şirniyyat; 4. konfeksion *(hazır paltar mağazası, mağazanın hazır paltar satılan şöbəsi)*



**confection[2]** [kən'fekʃn] *v* 1. konfet və s. bişirmək, dondurma hazırlamaq; 2. qadın paltarı hazırlamaq
**confectionary** [kən'fekʃnərɪ] *n* 1. şirniyyat fabriki; 2. konfet
**confectioner** [kən'fekʃənə'] *n* qənnadıçı, şirniyyatçı *(usta)*
**confectionery** [kən'fekʃnərɪ] *n* qənnadı / şirniyyat mağazası
**confederacy** [kən'fedrəsɪ] *n* konfederasiya, dövlətlərin ittifaqı; **Southern Confederacy** *amer. tar.* Cənub ştatlarının konfederasiyası
**confederal** [kən'fedərəl] *adj* federasiyaya aid olan, federativ
**confederate[1]** [kən'fedərɪt] *n* 1. müttəfiq, federasiyanın üzvü; 2. *hüq.* cinayət yoldaşı; şərik, ortaq, yoldaş *(cinayətdə)*
**confederate[2]** [kən'fedərɪt] *adj* birləşmiş, müttəfiq, federativ; **The Confederate States of America** Amerikanın federativ / birləşmiş Ştatları
**confederate[3]** [kən'fedəreɪt] *v* 1. ittifaqda/federasiyada birləşdirmək; 2. konfederasiyada / ittifaqda birləşmək
**confederation** [kən.fedə'reɪʃn] *n* konfederasiya, ittifaq; **the Confederation of British Industry** Britaniya sənayesinin konfederasiyası
**confederative** [kən'fedərətɪv] *adj* konfederativ, müttəfiq
**confer** [kən'fə:'] *v* (-rr-) 1. vermək, təqdim etmək; bağışlamaq, mükafatlandırmaq; təltif etmək; **to ~ a title upon** *smb.* bir kəsə titul vermək; **to ~ a degree** elmi dərəcə vermək; **to ~ knighthood** zadəganlıq titulu vermək/bəxş etmək; *The Queen conferred knighthoods on several distinguished men Kraliça bir sıra fərqlənmiş adamlara zadəganlıq rütbəsi verdi/bəxş etdi;* 2. məsləhətləşmək, bir yerdə müzakirə etmək; danışıq aparmaq; **to ~ with** *one's* **lawyer** vəkili ilə məsləhətləşmək; 3. *arx.* tutuşdurmaq, müqayisə etmək, tutuşdurub yoxlamaq; *Confer remarks/notes on the next pages Qeydləri sonrakı səhifələrlə tutuşdurub yoxla / yoxlayın*
**conferee** [.kɔnfə'ri:] *n* danışıqların/konfransın iştirakçısı
**conference** ['kɔnfərəns] *n* 1. konfrans, toplantı, müşavirə; **party ~** partiya konfransı / müşavirəsi; **international ~** beynəlxalq konfrans/müşavirə; **round-table ~** dəyirmi stol konfransı/müşavirəsi; **summit ~** yüksək səviyyəli konfrans; **Heads-of-Government Conference** dövlət başçılarının konfransı; **press ~** mətbuat konfransı, press konferensiya; *Many international conferences are held in Geneva Cenevrədə çoxlu beynəlxalq konfranslar keçirilir;* 2. fikir mübadiləsi, məsləhət, müzakirə, məsləhətləşmə; **to be in ~** 1) iclasda /müşavirədə olmaq / iştirak etmək; məsləhətləşmək, bir yerdə müzakirə etmək; *The director is in conference Direktor müşavirədədir;* 2) məsləhətləşmək, konsultasiya/məsləhət almaq; **to hold a ~** müşavirə / konfrans aparmaq / keçirmək
**conferment** [kən'fə:mənt] *n* vermə, verilmə *(ad, dərəcə)*
**confess** [kən'fes] *v* 1. etiraf etmək, boynuna almaq; **to ~ a fault** səhvi etiraf etmək / boynuna almaq; *The prisoner refused to confess his crime Dustaq cinayəti etiraf etməkdən imtina etdi; He confessed that he had not been telling the truth O, boynuna aldı ki, o, həqiqəti danışmırdı; The boy finally confessed to having stolen the money Oğlan nəhayət pulu oğurladığını boynuna aldı; I confess I was surprised to hear it Etiraf edirəm ki, mən bunu eşidərkən təəccübləndim;* 2. *kils.* tövbə etmək *(xristianlarda günahlarını keşişə söyləyərək tövbə etmək)*
**confessant** [kən'fesənt] *n kils.* tövbə edən
**confessedly** [kən'fesɪdlɪ] *adv* hamının tərəfindən qəbul / etiraf edildiyi kimi
**confession** [kən'feʃn] *n* 1. etiraf etmə, boynuna alma, etiraf; **~ of signature** imzasını etiraf etmə; 2. inam rəmzi; 3. *kils.* tövbə, tövbə etmə *(xristian dinində: keşiş qabağında tövbə etmə və keşişin günahları bağışlama mərasimi)*
**confessor** [kən'fesə'] *n* 1. tövbə edən, tövbəyə gələn *(tövbə etmək üçün keşişin yanına gələn adam);* 2. günahdan azad edən keşiş; 3. din yolunda əzablara qatlaşan övliya *(xristian dinində)*
**confidant** [.kɔnfɪ'dænt] *n* 1. yaxın adam, istəkli, sirdaş; dost; vəkil edilmiş şəxs
**confidante** [.kɔnfɪ'dænt] *n* 1. yaxın adam *(qadın, qız),* sirdaş *(qadın, qız),* dost *(qadın, qız);* 2. vəkil edilmiş şəxs *(qadın, qız)*
**confide** [kən'faɪd] *v* 1. *(in)* etibar etmək, inanmaq; *We confide in our friends Biz dostlarımıza etibar edirik/inanırıq; There's no one here I can confide in Burada mənim inandığım heç kəs / kim yoxdur;* 2. gizlicə olaraq demək, sirr vermək; *He confided his troubles to his friend O öz dərdini dostuna açdı;* 3. tapşırmaq, inanıb tapşırmaq, həvalə etmək; *The children were confided to the care of the nurse Uşaqları dayənin himayəsinə verdilər;* 4. *(in)* ümid olmaq, arxayın etmək, güvənmək, bel bağlamaq, inanmaq
**confidence** ['kɔnfɪdəns] *n* 1. inam, etibar, etimad; **growing ~** artan inam/etimad; **~ in the government** hökumətə inam/etibar; **to enjoy** *smb.'s* **~** bir kəsin etimadından istifadə etmək; **to gain** *smb.'s* **~** bir kəsin etimadını qazanmaq; **to place ~ in** *smb.* bir kəsə etibar etmək; **to shatter** *smb.'s* **~** bir kəsin inamını qırmaq/sarsıtmaq; *He could not give them his confidence O onlara etibar edə/inana bilmədi;* 2. gizli məlumat, sirr; **to hear ~s** etirafı dinləmək; **in strict ~** tam məxfi; 3. qətiyyət, yəqinlik, əzm, əminlik, inanma; **to answer with ~** yəqinliklə/əzmlə / inamla cavab vermək; *He answered all the questions with confidence O, bütün suallara əzmlə / inamla ca-*

*vab verdi;* **to have ~ in future** gələcəyə inamı olmaq; **to shake ~** inamı / etibarı sarsıtmaq; **to expect** ***smth.*** **with ~** bir şeyi əminliklə/inamla gözləmək; 4. özünə qürrələnmə/güvənmə/inanma/arxayın olma;

◊ **~ game/trick** fırıldaq, hiyləgərlik, dələduzluq; etibardan sui-istifadə etmə; **~ man** dələduz, fırıldaqçı, adamaldadan

**confident** ['kɔnfɪdənt] *adj* 1. əmin, arxayın, xatircəm; möhkəm, qəti, əzmli; **~ of victory / of success** qələbəyə / müvəffəqiyyətə əmin olan; *He is confident that everything will go well O, əmindir ki, hər şey yaxşı olacaq;* 2. qətiyyətli, cəsarətli, inamlı, cürətli; özünə inanan/qürrələnən; lovğa, saymaz; **a very ~, uppish young man** lovğa, həyasız gənc oğlan

**confidential** [ˌkɔnfɪ'denʃl] *adj* 1. gizli, məxfi; **~ document** gizli / məxfi sənəd; **~ information** gizli/məxfi məlumat; **~ correspondence** gizli / məxfi yazışma; **~ letters** gizli/məxfi məktublar; 2. tez inanan, hər kəsə inanan, sadəlövh; **to become ~ with strangers** özgələrə / tanış olmayan adamlara inanmaq; 3. etibardan istifadə edən *(dost və s. haq.)*

**confidentially** [ˌkɔnfɪ'denʃəlɪ] *adv* məxfi, gizli, məxfi / gizli olaraq, gizli bir tərzdə; **to speak ~ to** ***smb.*** bir kəslə gizli (olaraq) danışmaq

**configuration** [kənˌfɪgju'reɪʃn] *n* konfiqurasiya, forma, xarici görünüş; **the ~ of the earth's surface** yer səthinin konfiqurasiyası; **the ~ of the solar system** günəş sisteminin konfiqurasiyası

**confine** [kən'faɪn] *v* 1. məhdudlaşdırmaq, məhdud etmək, hədd qoymaq; **to ~ the use of a word** sözün işlənməsini məhdudlaşdırmaq; *Please confine your remarks to the subject we're talking about Zəhmət olmasa, iradlarını/iradlarınızı haqqında danışdığımız mövzu ətrafında məhdudlaşdır/məhdudlaşdırın;* 2. bağlı yerdə saxlamaq *(qəfəsdə və s.)*, dustaq etmək, salmaq *(həbsxanaya və s.)*; **to ~ a bird in a cage** quşu qəfəsə salmaq; *Isn't it cruel to confine a bird in a cage? Quşu qəfəsə salmaq qəddarlıq deyilmi?* **to ~ a prisoner in a cell** dustağı kameraya salmaq; 3. *Adətən məchul növdə işlənir:* **to be ~d to bed** yatağa düşmək; *John was confined to bed for a week with his cold Soyuqladığı üçün Con bir həftə yatağa düşdü;* **to be ~d to** ***one's*** **room** xəstəlik üzündən otağından bayıra çıxmamaq; *His job confined him to London İşi onu Londona bağladı;* 4. yataqda saxlamaq, yatızdırmaq *(xüs. hamilə qadını)*; *She was confined for some days before she gave birth to a child in time Doğmazdan əvvəl onu bir neçə gün yatızdırdılar və o vaxtında doğdu*

**confined** [kən'faɪnd] *adj* 1. məhdud, dar; **a ~ space** məhdud / dar məkan; *It was too difficult to work efficiently in such a confined space Belə dar bir yerdə səmərəli işləmək çox çətin idi;* 2. həbs edilmiş, həbsə salınmış; 3. doğmasına/azad olmasına az qalmış *(qadın haq.)*; 4. *tib.* qarın bərkiməsindən/qəbizlikdən əziyyət çəkən, tez-tez qəbiz olan; 5. *k.t.* bordaqda saxlanılan *(mal-qara haq.)*

**confinement** [kən'faɪnmənt] *n* 1. qalaya/ həbsə salma, dustaq etmə; **solitary ~** bir adamlıq kamerada saxlama *(dustağı)*; **~ to barracks** *hərb.* ev dustağı; 2. *d.d.* doğuş; uşaq doğmaq üçün qadının yataqda yatması

**confines** ['kɔnfaɪnz] *n* sərhəd, hüdud; çərçivə; **within the ~ of family life** ailə həyatı çərçivəsində; **within the ~ of one country** bir ölkənin sərhədi / hüdudları daxilində; *This is outside the confines of human knowledge Bu, insan idrakı hüdudlarından xaricdədir*

**confirm** [kən'fə:m] *v* təsdiq etmək; doğru olduğunu sübut etmək; *Please confirm your telephone message in writing Zəhmət olmasa, telefonla dediklərini / dediklərinizi yazılı olaraq təsdiq et/edin; The rumours of an attack were later confirmed Hücum haqqındakı şayiələr sonralar təsdiq edildi; The announcement confirmed my suspicions Radio ilə verilən məlumat mənim şübhələrimi təsdiq etdi; The king confirmed that the election would be on June 20[th] Kral seçkinin iyunun 20-də olacağını təsdiq etdi*

**confirmation** [ˌkɔnfə'meɪʃn] *n* 1. sübut, dəlil, əsas, fakt; təsdiq etmə; **~ of a statement/news/a promise/rumours** məlumatı/xəbəri/vədi/şayiələri təsdiq etmə; *The report lacked confirmation Hesabat təsdiq edilməmişdi; Please send us written confirmation of your holiday dates Zəhmət olmasa, bizə məzuniyyətinin/məzuniyyətinizin tarixi haqqında yazılı sübut göndər/göndərin;* 2. təsdiq, təsdiqlənmə, təsdiqləmə; ratifikasiya edilmə; 3. *kils.* konfirmasiya *(katoliklərdə və protestantlarda cavan oğlan və qızları kilsə üzvlüyünə qəbul etmə mərasimi)*

**confirmative** [kən'fə:mətɪv] *adj* təsdiq edən, təsdiqləyən

**confirmatory** [kən'fə:mətrɪ] *adj* = **confirmative**

**confirmed** [kən'fə:md] *adj* 1.islahedilməz; **~ drunkard** islahedilməz əyyaş; 2. möhkəm əqidəli/məsləkli, öz əqidəsindən dönməyən, etiqadlı; **~ bachelor** öz əqidəsindən / inadından dönməyən subay kişi

**confiscate**[1] ['kɔnfɪskeɪt] *adj* müsadirə edilmiş, alınmış *(əldən)*

**confiscate**[2] ['kɔnfɪskeɪt] *v* müsadirə etmək; əlindən almaq; *The teacher confiscated Tom's catapult Müəllim Tomun quşatanını əlindən aldı*

**confiscation** [ˌkɔnfɪs'keɪʃn] *n* müsadirə, müsadirə etmə, əlindən alma

**conflagrant** [kən'fleɪgrənt] *adj* odda/ alovda yanan, alova bürünmüş, alov bürümüş

**conflagrate** ['kɔn'flegreɪt] *v* 1. yanmaq, alışıb yanmaq, od tutmaq; 2. yandırmaq; həyəcanlandırmaq



**conflagration** [ˌkɔnflə'greɪʃn] *n* böyük yanğın *(xüs. meşələri, şəhərləri və s. bürüyən)*; **world ~** *şair.* dünya yanğını *(müharibə haq.)*

**conflate** [kən'fleɪt] *v* 1. birləşdirmək, əridib bitişdirmək; 2. iki mətni, məlumatı və s. bir yerə birləşdirmək/qatmaq; *The results of the two experiments were conflated İki eksperimentin nəticəsi birləşdirildi*

**conflation** [kən'fleɪʃn] *n* 1. birləşmə; ərinti; xəlitə, qatışıq; 2. iki məlumatı, mətni birləşdirmə

**conflict**[1] ['kɔnflɪkt] *n* 1. münaqişə, ixtilaf, toqquşma; **armed ~** silahlı toqquşma/münaqişə; *Armed conflict could start at any time Hər an / vaxt silahlı toqquşma baş verə bilərdi;* **~ of interests** maraqların toqquşması; 2. barışmazlıq, ziddiyyət; **the ~ between** ***one's*** **duty and** ***one's*** **desires** bir kəsin əməli və arzuları arasında ziddiyyət; **a long ~ between employers and workers** sahibkarlar və fəhlələr arasında olan uzun ziddiyyət/barışmazlıq; 3. baxışların/fikirlərin mübarizəsi

**conflict**[2] ['kɔnflɪkt] *v* 1. **(with)** zidd olmaq; ziddiyyət təşkil etmək; *My interests conflict with yours Mənim maraqlarım səninkinə / sizinkinə ziddir;* 2. mübarizə aparmaq / etmək

**conflicting**[1] [kən'flɪktɪŋ] *adj* zidd, ziddiyyət təşkil edən; **~ opinions / theories, etc.** zidd/ziddiyyət təşkil edən baxışlar/nəzəriyyələr və s.

**confluence** ['kɔnfluəns] *n* 1. *(adət. təkdə işlənir)* birləşdiyi yer *(çayın və s.)*; **the ~ of the Blue Nile and the White Nile** Mavi Nilin və Ağ Nilin birləşdiyi yer; 2. *məc.* birləşmə; **a ~ of ideas** fikirlərin birləşməsi

**conform** [kən'fɔ:m] *v* 1. **(to)** uyğunlaşdırmaq, müvafiqləşdirmək; 2. uyğunlaşmaq; uzlaşmaq; düz gəlmək; *His ideas do not conform with mine Onun fikirləri mənimki ilə düz gəlmir;* **to ~ to the specifications** spesifikasiyaya uyğunlaşmaq; *Most people willingly conform to the customs of society Əksər adamlar cəmiyyətin ənənəsinə məmnuniyyətlə uyğunlaşırlar / əməl edirlər*

**conformability** [kənˌfɔ:mə'bɪlɪtɪ] *n* uyğunluq, mütabiqlik, müvafiqlik

**conformable** [kən'fɔ:məbl] *adj* 1. **(to)** uyğun gələn, uyğun/müvafiq olan, düz gələn, uyan; *I've tried to be conformable to your wishes Mən sənin/sizin arzuna/arzunuza uyğun olmağa çalışmışam; Government actions should always be conformable to the will of the people Hökumətin hərəkətləri həmişə xalqın istəyinə uyğun olmalıdır/gəlməlidir/müvafiq olmalıdır;* 2. yerin üstündə və altında eyni formada olan *(qaya haq.)*; **~ beds of rocks** yer üstündə və altında eyni oturacağı olan qayalar

**conformation** [ˌkɔnfɔ:'meɪʃn] *n* 1. forma, quruluş; 2. uyğunlaşma, uyğunlaşdırma, uyğun hala salma; 3. tabe etmə / edilmə; 4. *qram.* tabelilik; 5. eksteryer *(heyvanın, xüs. atın xarici görkəmi, duruşu)*

**conformist** [kən'fɔ:mɪst] *n* konformist *(cəmiyyətdəki qayda-qanuna, ənənəyə, adətə və s. uyğun hərəkət edən/tabe olan adam)*

**conformity** [kən'fɔ:mɪtɪ] *n* 1. uyğunluq, müvafiqlik; razılıq; **~ between the testimony and the facts** şahidlik və dəlillər arasında uyğunluq; **in ~ with your instructions** sənin/sizin göstərişlərinə/göstərişlərinizə müvafiq olaraq; 2. tabe olma, itaət etmə; tabelilik; 3. ortodoksallıq, ortodoksluq *(bir məsləkin sabit və ardıcıl tərəfdarı olma)*, ingilis kilsəsinin ehkamlarına itaət edən *(adam)*

**confound** [kən'faund] *v* 1. pərt etmək, utandırmaq; təşvişə / həyəcana salmaq; çətin vəziyyətə salmaq/vəziyyətdə qoymaq; **to be ~ed by** ***smb.'s*** **evidence** bir kəsin ifadəsinə görə çaşmaq; **to feel ~ed by** ***smb.'s*** **praise** bir kəsin tərifindən utanmaq; 2. qarışdırmaq, dolaşdırmaq, çaşdırmaq; **to ~ words/date/address/the meaning of words** sözləri/tarixi/ünvanı/sözlərin mənasını qarışdırmaq/dolaşdırmaq; *I always confound him with his brother Mən həmişə onu qardaşı ilə qarışdırıram;* 3. uçurmaq, dağıtmaq, puça çıxartmaq; **to ~ plans / hopes** planları / ümidləri puça çıxartmaq

**confounded** [kən'faundɪd] *adj* 1. utanmış, xəcalət çəkmiş, utanan, xəcalət çəkən; **to feel ~** utanmaq, xəcalət çəkmək; *I felt confounded by your bad manners Sənin / Sizin yaramaz hərəkətindən/hərəkətinizdən mən utandım/xəcalət çəkdim;* 2. lənətə gəlmiş; *That confounded boy's bad behaviour annoyed me O lənətə gəlmiş oğlanın yaramaz davranışı məni əsəbiləşdirdi*

**confoundedly** [kən'faundɪdlɪ] *adv* çox pis, son dərəcə, dəhşətli; *It's confoundedly hot / cold in here Burada son dərəcə istidir / soyuqdur*

**confront** [kən'frʌnt] *v* 1. qarşı/əks durmaq; *My house confronts yours Mənim evim səninki ilə / sizinki ilə qarşı-qarşıyadır;* 2. üz-üzə gəlmək; **to be ~ed by smb.** bir kəslə üz-üzə gəlmək; *The soldiers were confronted by two terrorists as they left their camp Düşərgələrindən çıxanda əsgərlər iki terroristlə üz-üzə gəldilər;* 3. qarşılaşmaq; **to be ~ed by difficulties** çətinliklərlə qarşılaşmaq; **to ~ danger** təhlükə ilə qarşılaşmaq; 4. qarşılaşdırmaq, üzləşdirmək, üz-üzə qoymaq; *They confronted the prisoner with his accusers Onlar məhbusu ittihamçıları ilə üzləşdirdilər;* 5. müqayisə etmək, tutuşdurmaq

**confrontation** [ˌkɔnfrʌn'teɪʃn] *n hüq.* üzləşmə, üzləşdirmə, əksdurma; **a ~ between the government and the unions** dövlət və həmkarlar ittifaqları arasında qarşıdurma

**confuse** [kən'fju:z] *v* 1. çaşdırmaq; **to ~ a pupil by asking difficult questions** çətin suallar verməklə şagirdi çaşdırmaq; *They confused me by asking so many questions Onlar həddən ziyadə sual verməklə məni çaşdırdılar;* 2. qarışdırmaq,

dəyişik salmaq; **to ~ authors** müəllifləri dəyişik salmaq; **to ~ two words of the same spelling** eyni yazılan iki sözü qarışdırmaq; *Don't confuse Austria with Australia Avstriya ilə Avstraliyanı qarışdırma,/qarışdırmayın Avstriya ilə Avstraliyanı dəyişik salma/salmayın;* **3.** çaşdırmaq, aldatmaq; *We tried to confuse the enemy by swimming along the river Biz çay uzunu/boyunca üzməklə düşməni çaşdırmağa çalışdıq*

**confused** [kən'fju:zd] *adj* **1.** karıxdırılmış, utandırılmış, həyəcana / təşvişə salınmış, çətin vəziyyətə salınmış; **to become ~** çaşmaq, karıxmaq, tutulmaq, utanmaq; *All your changes of the plan have made me totally confused Sənin / Sizin planı tez-tez dəyişdirməyin/dəyişdirməyiniz məni tamamilə çaşdırıb; The old lady easily gets confused Bu qoca xanım asanlıqla karıxır;* **2.** qarışdırılmış, dolaşıq salınmış; qarışıq, aydın olmayan; **~ sounds** aydın olmayan səslər; **~ account** dolaşıq hesabat; **~ statement** dolaşıq / qarışıq bəyanat

**confusedly** [kən'fju:zdlı] *adv* qarışıq, dolaşıq, çaşbaş, dolaşıq bir tərzdə /surətdə

**confusion** [kən'fju:ʒn] *n* **1.** utanma, sıxılma, çaşma, karıxma; xəcalət; özünü itirmə, qarıxma, çaşıb qalma; **to put *smb.* to ~** bir kəsi karıxdırmaq/qarıxdırmaq/çaşdırmaq; *Her unexpected arrival threw us into total confusion Onun gözlənilməz / qəfil gəlişi bizi büsbütün çaşdırdı;* **2.** səliqəsizlik, qarışıqlıq; **to leave *one's* papers in ~** kağızlarını səliqəsiz atıb getmək; *Your room is in complete confusion; tidy it up at once! Sənin/Sizin otağın /otağınız tamam səliqəsizdir; onu dərhal yığışdır / yığışdırın!* **3.** dolaşıqlıq, qarışıqlıq; **~ of thoughts** fikirlərin dolaşıqlığı; **~ of sounds** səslərin qarışdırılması; **4.** ictimai qarışıqlıq, iğtişaş, həyəcan *(ictimai)*, qarmaqarışıqlıq

**confutable** [kən'fju:təbl] *adj* təkzib oluna bilən, yalana çıxarıla bilən

**confutation** [ˌkən'fju:teıʃn] *n* təkzib etmə/edilmə; yalana çıxartma/çıxardılma; təkzib

**confute** [kən'fju:t] *v* təkzib etmək, yalana çıxartmaq, yalan olduğunu sübut etmək

**congeal** [kən'dʒi:l] *v* **1.** qurumaq, donmaq; laxtalanmaq; *His blood congealed Onun qanı qurudu (dəhşətdən və s.);* **2.** dondurmaq; *Use hot water to rinse the congealed fat off the dinner plates Xörək boşqablarından donmuş piyi yumaq üçün isti sudan istifadə et/edin;* **3.** laxtalanmaq; *The blood had congealed round the cut on her knee Onun dizindəki kəsiyin ətrafında qan laxtalanmışdı*

**congenial** [kən'dʒi:njəl] *adj* **1. (with, to)** yaxın, qohum; uyğun *(ağılca, ruhca, istedadca və s.)*; **~ tastes** oxşar/yaxın zövqlər; *Poetry and music are congenial Poeziya və musiqi arasında yaxınlıq var;* **2.** yaraşan, uyğun gələn, yararlı; uyğun, münasib, əlverişli; **~ employment** münasib / yararlı iş/vəzifə; **climate ~ to health** sağlamlıq üçün yararlı / uyğun / münasib ab-hava / iqlim

**congenital** [kən'dʒenıtl] *adj* anadangəlmə; **~ blindness** anadangəlmə korluq; **~ defect** anadangəlmə qüsur; **~ liar** anadangəlmə yalançı; **~ idiocy** anadangəlmə axmaqlıq / giclik

**congested** [kən'dʒestıd] *adj* **1.** çox əhali yerləşdirilmiş; əhalisi həddindən çox/artıq olan, əhalisi çox sıx olan *(şəhər, rayon və s. haq.)*; həddindən artıq yüklənmiş / məşğul; **~ traffic** həddən artıq yüklənmiş nəqliyyat; **2.** sıx; tıxlanmış; **~ population** sıx əhali; **3.** *tib.* dolu, qədərindən / həddindən artıq doldurulmuş / dolmuş *(bədən üzvləri haq.)*

**congestion** [kən'dʒestʃn] *n* sıxlıq; dolu/sıx olma; **traffic ~** nəqliyyatın sıxlığı; **~ of population** əhalinin sıxlığı; **~ of the lungs** ciyərlərin dolu olması;

**conglomerate[1]** [kən'glɔmərıt] *n* **1.** konqlomerat *(müxtəlif şeylərin və hissələrin nizamsız yığını, birləşməsi); The new ensemble was a conglomerate of three different bands Yeni ansambl üç müxtəlif dəstənin birləşməsindən ibarət idi;* **2.** müxtəlif firmaların birləşməsindən ibarət geniş korporasiya; **a mining/an airline ~** mədən/hava yolları korporasiyası / şirkəti

**conglomerate[2]** [kən'glɔmərıt] *adj* yığılmış, birləşdirilmiş, bir yerə toplanmış

**conglomerate[3]** [kən'glɔmərıt] *v* ümumi kütləyə çevirmək / çevrilmək

**conglomeration** [kən.glɔmə'reıʃn] *n* konqlomerasiya *(bir neçə şeyin öz xassələrini saxlamaqla birləşməsi)*; yapışma, bir kütlə halında birləşmə

**congratulate** [kən'grætjuleıt] *v* **(on, upon)** təbrik etmək; **to ~ *smb.* (on/upon)** bir kəsi təbrik etmək; *We congratulated him on having passed the examination İmtahanı verməsilə əlaqədar olaraq biz onu təbrik etdik; Let me congratulate you on the birth of your son İcazə ver /verin, səni /sizi oğlunun / oğlunuzun anadan olması münasibəti ilə təbrik edim*

**congratulation** [kən.grætju'leıʃn] *n (adət. cəmdə)* təbrik etmə, gözaydınlığı vermə; təbrik, gözaydınlığı; *I thank you for your kind congratulations on my marriage Evlənməyim münasibəti ilə təbrikinə/təbrikinizə görə sənə/sizə təşəkkürümü bildirirəm;* **a letter of ~** təbrik məktubu

**congratulatory** [kən'grætjulətərı] *adj* təbrik; **~ speech** təbrik nitqi; **~ telegram** təbrik teleqramı

**congregate[1]** ['kɔŋgrıgeıt] *adj* yığılmış, toplanmış; birləşdirilmiş

**congregate[2]** ['kɔŋgrıgeıt] *v* yığışmaq, toplaşmaq; *A crowd quickly congregated round the speaker Adamlar tezliklə natiqin ətrafına toplaşdı*

**congregation** [ˌkɔŋgrı'geıʃn] *n* **1.** bir yerə toplaşmış adamlar / camaat, bir yerə toplanmış kütlə; **2.** *kils.* konqreqasiya *(kilsə icmalarının birləşməsi)*; **3.** papa kuriyasının şöbəsi *(papa hakimiyyətinin baş orqanı)*; **4.** müəyyən bir kilsəyə ibadətə gələn adamlar

**congress** ['kɔŋgres] *n* **1.** konqres; qurultay; **the Congress of Vienna** Vyana Konqresi; **a medical ~** tibb işçilərinin konqresi; **The World Peace Congress** Sülh tərəfdarlarının Ümumdünya konqresi / qurultayı; **to go into ~** konqresdə / qurultayda iştirak etmək; **2.** seçki yolu ilə seçilmiş qanunvericilik orqanı / parlamentin adı *(ABŞ-da və bəzi digər ölkələrdə); There will soon be elections to our congress Tezliklə bizim konqresə seçkilər keçiriləcək; Our last congress was/were unable to decide this question Bizim son konqresimiz bu məsələni həll edə bilmədi;* **3.** Hindistanda siyasi partiya

**congressional** [kɔŋ'greʃənl] *adj* konqres; **~ elections** konqres seçkiləri; **a ~ committee** konqres komissiyası; **~ debates** konqres müzakirələri

**Congressman** ['kɔŋgresmən] *n (pl* **-men** [-mən]) konqresmen, konqres üzvü *(xüs. ABŞ-da)*

**congruence** ['kɔŋgruəns] *adj* uyğunluq, müvafiqlik, mütabiqlik; yekdillik; **~ with the law** qanuna müvafiqlik / uyğunluq

**congruent** ['kɔŋgruənt] *adj* **= congruous**

**congruity** [kɔŋ'gru:ıtı] *n* uyğunluq, müvafiqlik, münasiblik; **to lack ~ with one another** bir-biri ilə uyğun olmamaq / gəlməmək

**congruous** ['kɔŋgruəs] *adj* **1. (with, to)** müvafiq / uyğun olan, həmahəng, uyğun, uyğun gələn; **measures ~ with the seriousness of the situation** vəziyyətin ciddiliyinə uyğun/müvafiq olan tədbirlər; *Your behaviour is not congruous with your social rank Sənin/Sizin hərəkətlərin /hərəkətləriniz sənin/sizin ictimai mövqeyinə/mövqeyinizə uyğun gəlmir / deyil*

**conic** ['kɔnık] *adj* konus, konusşəkilli, konusformalı

**conical** ['kɔnıkəl] *adj* konusşəkilli; **a ~ hat** konusşəkilli papaq

**conifer** ['kɔnıfə'] *n bot.* iynəyarpaqlı ağac

**coniferous** [kou'nıfərəs] *adj* iynəyarpaqlı; **~ trees** iynəyarpaqlı ağaclar

**conjectural** [kən'dʒektʃərəl] *adj* təxmini, təqribi, təxmin /güman edilən; **a ~ hypothesis** təxmini / təqribi fərziyyə

**conjecture** [kən'dʒektʃə'] *v* təxmin/güman/fərz /ehtimal/zənn etmək; fikrində tutmaq, niyyətində olmaq; **to ~ the cause of *smth.*** bir şeyin səbəbini təxmin / güman etmək; *It was just as I had conjectured Mən necə təxmin edirdimsə, elə də oldu*

**conjoin** [kən'dʒɔın] *v* birləşdirmək; bitişdirmək; birləşmək, bitişmək

**conjoined** [kən'dʒɔınd] *adj* birləşmiş, bitişmiş

**conjoint** ['kɔndʒɔınt] *adj* birləşmiş, birləşdirilmiş, birgə; ümumi; **~ action** birgə hərəkət

**conjointly** ['kɔndʒɔıntlı] *adv* birgə, bir yerdə, birlikdə, əlbir olaraq

**conjugal** ['kɔndʒugəl] *adj* ər-arvad; kəbin; **~ bed** ər-arvad çarpayısı/yatağı; **~ happiness** ər-arvadlıq xoşbəxtliyi; **~ rights** ər-arvadlıq hüquqları

**conjugality** [ˌkɔndʒu'gælıtı] *n* ər-arvadlıq, izdivac, kəbinli olma

**conjugate[1]** ['kɔndʒugıt] *adj* **1.** birləşmiş, birləşdirilmiş; bitişdirilmiş; **2.** qoşa, cüt *(yarpaq haq.)*; **3.** bir-birinə bağlanmış; bağlı; əlaqədar; **~ angles** *riyaz.* bitişik/ortaq bucaqlar; **~ proteins** *kim.* əlaqədar proteinlər *(mürəkkəb zülallar)*

**conjugate[2]** ['kɔndʒugeıt] *v* **1.** *qram.* təsrif etmək *(feli şəxs, kəmiyyət və zaman formalarına görə); How does this verb conjugate? Bu fel necə təsrif edilir?* **2.** *biol.* birləşmək, qarışmaq

**conjugation** [ˌkɔndʒu'geıʃn] *n* **1.** birləşmə, birləşdirmə; **2.** *qram.* dəyişmə, təsrif *(fel haq.)*

**conjunct** [kən'dʒʌŋkt] *adj* birləşmiş, bağlı, birgə; **~ attempt** birgə səy; **~ professor** professor köməkçisi

**conjunction** [kən'dʒʌŋkʃn] *n* **1.** birləşdirmə, birləşdirilmə; birləşmə; əlaqə; rabitə; **in ~ with** birlikdə, bir yerdə, birgə; *The British police are working in conjunction with the FBI on the investigation Britaniya polisi FTB ilə birlikdə / bir yerdə tədqiqat aparır;* **2.** təsadüf etmə, bir vaxta düşmə, bir vaxtda olma *(hadisə haq.)*; **3.** *qram.* bağlayıcı; **coordinating ~s** tabesizlik əlaqəsi bildirən bağlayıcılar; **subordinating ~s** tabelilik əlaqəsi bildirən bağlayıcılar; **4.** *astr.* eyni istiqamətdə hərəkət edən iki göy cisminin zahiri yaxınlaşması; *This month Mars is in conjunction with Venus Bu ay Mars (zahirən) Venera ilə yaxınlaşacaq*

**conjunctional** [kən'dʒʌŋkʃnl] *adj qram.* bağlayıcı; **~ words** bağlayıcı sözlər

**conjunctiva** [ˌkɔndʒʌŋk'taıvə] *n anat.* konyunktiva *(göz qapağını gözlə birləşdirən selikli qişa)*

**conjunctive[1]** [kən'dʒʌŋktıv] *n qram.* **1.** bağlayıcı; **2.** felin lazım forması

**conjunctive[2]** [kən'dʒʌŋktıv] *adj* **1.** bağlayıcı, birləşdirici, bitişdirici; **~ tissue** *anat.* birləşdirici toxuma; **2.** *qram.* bağlayıcı; **~ pronoun** bağlayıcı əvəzlik; **3.** lazım forması *(felin)*; **~ mood** felin lazım forması

**conjunctivitis** [kən.dʒʌŋktı'vaıtıs] *n tib.* konyunktivit *(göz qapağı selikli qişasının iltihabı)*

**conjunctly** [kən'dʒʌŋktlı] *adv* birgə, bir yerdə, birlikdə, bərabər

**conjure** ['kʌndʒə'] *v* **1.** cadugərlik etmək, cadulamaq, tilsimləmək; **2.** ruhu çağırmaq *(həm də* **to ~ up)**; **to ~ up the spirits of the dead** ölənlərin ruhunu çağırmaq; **3.** ruhu qovmaq *(həm də* **to ~ away, to ~ out of)**; **4.** təsəvvürə gətirmək, təsəvvür etmək; *(həm də* **to ~ up)**; **to ~ up visions of the past** keçmiş mənzərəni təsəvvürə gətirmək / təsəvvür etmək

**conjurer** ['kʌndʒərə'] *n* **1.** fokusçu; hoqqabaz; cadugər, cadu ilə məşğul olan adam

**conjuring** ['kʌndʒərıŋ] *n* **= conjurer**

**conk[1]** [kɔŋk] *n* **1.** burun; **2.** baş; **3.** başa vurulan /

endirilən zərbə; 4. taqqıltı, tıqqıltı *(motor səsi)*; döyünmə, vurma *(ürək səsi)*
**conk²** [kɔŋk] *v* 1. başa ağır zərbə endirmək; 2. işləməyi dayandırmaq, sönmək *(maşın haq.)*; *The car conked out halfway up the hill Maşın təpəyə qalxanda yarı yolda dayandı;* 3. yorulub dayanmaq; yuxuya getmək və ya ölmək; *Grandpa usually conks out for an hour after lunch Baba günorta yeməyindən sonra bir saat yatır*
**conky** ['kɔŋkı] *adj kob.* yekəburun
**connate** ['kɔneıt] *adj* 1. anadangəlmə, fitri; 2. qohum, qohumluq, bir-birinə yaxın
**connect** [kə'nekt] *v* 1. **(with, to)** birləşdirmək, bağlamaq; **to ~ the two banks of a river by a bridge** çayın iki sahilini körpü ilə birləşdirmək, çayın üstündən körpü salmaq; *The two towns are connected by an excellent bus service Bu iki şəhər arasında əla avtobus xidməti var; This road connects London with Edinburgh Bu yol Londonu Edinburqla birləşdirir;* 2. bağlanmaq, əlaqələnmək; *This sentence does not seem to connect with the context Bu cümlə kontekstə uyğun gəlmir;* 3. əlaqəsi olmaq *(qohumluq)*; *We are distantly connected Bizim uzaq qohumluq əlaqəmiz var; He is connected with the Mamedovs by marriage O, arvad tərəfdən Məmmədovlarla qohumdur;* 4. əlaqələndirmək; **to ~ two ideas in** ***one's*** **mind** iki fikri başında birləşdirmək; 5. düz / uyğun gəlmək *(cədvəl üzrə: qatar, gəmi və s. haq.)*; *This train connects with the other at Birmingham Bu qatar elə gəlir ki, Birminqham şəhərində düşüb ona minmək olur*
**connected** [kə'nektıd] *adj* 1. **(with)** rabitəli, əlaqələndirilmiş; 2. qohumluq əlaqəsi olan; *He is well connected Onun yaxşı qohumluq əlaqələri var; Most European royal families are connected with each other Əksər Avropa zadəgan ailələrinin bir-biri ilə qohumluq əlaqələri var;* 3. məntiqli, əlaqəli, rabitəli; **~ speech** məntiqli/rabitəli nitq; **~ events** əlaqəli hadisələr
**connectedly** [kə'nektıdlı] *adv* səlis, rəvan, məntiqli, rabitəli
**connecting** [kə'nektıŋ] *adj* birləşdirici, bitişdirici; bağlayıcı; **~ link** birləşdirici həlqə
**connection** [kə'nekʃn] *n* 1. əlaqə; **~ between two ideas** iki fikir arasında əlaqə; *In this connection... Bununla əlaqədar olaraq...;* 2. birləşdirilmə, birləşdirmə; qoşma, qoşulma, bağlama, bağlanma; **the ~ of a new telephone** yeni telefonun qoşulması *(xəttə)*; 3. əlaqə / rabitə vasitəsi; *The Steamer is the only connection between the island and mainland Paroxod materiklə ada arasında yeganə əlaqə vasitəsidir;* 4. vaxt cədvəllərinin uyğun/ düz gəlməsi *(qatarların, gəmilərin və s.)*: *The trains run in connection with the steamers Qatarların hərəkət cədvəli paroxodlarınkı ilə uyğunlaşdırılıb;* **to miss** ***one's*** **~** başqa qatara və ya paroxoda minməyə gecikmək; 5. *pl* əlaqələr, dostluq; *He's a man with good connections Onun geniş əlaqələri var;* **to form useful ~s** faydalı əlaqələr yaratmaq; 6. qohum, qohumluq; 7. alıcı, müştəri; **to establish a ~** müştəri yığmaq; 8. cinsi əlaqə; **to form a ~** cinsi əlaqədə olmaq; **criminal ~** *hüq.* cinayət əlaqəsi; 9. birlik, birləşmə *(siyasi, ticarət və ya dini baxımdan)*; 10. *amer. d.d.* narkotik satmaq işində vasitəçi, narkotik satan *(adam)*
**connective¹** [kə'nektıv] *n* 1. *qram.* birləşdirici / bağlayıcı söz; bağlayıcı ədat; 2. *bot.* tozluq *(çiçəyin erkəkciyində olan toz kisəsi)*; 3. *anat.* birləşdirici toxuma
**connective²** [kə'nektıv] *adj* bağlayıcı, bağlayan, birləşdirici; **~ word** *qram.* bağlayıcı söz; **~ tissue** *anat.* birləşdirici toxuma
**connexion** [kə'nekʃn] *n* = **connection**
**connexity** [kə'neksıtı] *n* əlaqə, əlaqəlilik; rabitə, rabitəlilik
**connive** [kə'naıv] *v* göz yummaq, yol/imkan vermək *(pis işə)*, görməməzliyə vurmaq; **to ~ at the violation of the rules** qanun pozuntusuna göz yummaq/barmaqarası baxmaq; *By not protesting you are conniving at the destruction of the environment Etiraz etməməklə sən / siz ətraf mühitin məhv olmasına göz yumursan / yumursunuz*
**connivance** [kə'naıvəns] *n* göz yumma, görməməzliyə vurma, mane olmama *(pis işə)*, yol /fürsət/imkan vermə *(qanunsuz bir işə)*; səhlənkarlıq; danışıqsız razı olma
**connoisseur** [.kɔnı'sɔ:ʳ] *n fr.* yaxşı bilən / yaxşı tanıyan, qiymət verə bilən *(mütəxəsis)*; **a ~ of painting** rəssamlığa qiymət verə bilən, rəssamlığı yaxşı bilən; **a ~ of wine** şərabı yaxşı tanıyan; *My uncle is a connoisseur of wines Mənim dayım şərabı yaxşı tanıyandır / tanıyır*
**connotation** [.kɔnə'teıʃn] *n* əlavə məna çaları; *"Home" has a connotation of comfort "Ev" sözünün əlavə məna çaları rahatlıqdır*
**connote** [kə'nout] *v* 1. əlavə mənaya malik olmaq; 2. *d.d.* göstərmək, bildirmək, ifadə etmək
**connubial** [kə'nju:bıəl] *adj* ər-arvad; **~ life** ər-arvad həyatı; **~ bliss** ər-arvad xoşbəxtliyi / səadəti
**conquer** ['kɔŋkəʳ] *v* 1. istila/zəbt etmək, almaq; **to ~ a country/a new territory** ölkə/yeni ərazi istila etmək/almaq; *The Normans conquered England in 1066 Normanlar İngiltərəni 1066-cı ildə istila etdilər;* 2. qalib gəlmək; **to ~ the enemy** düşmənə qalib gəlmək; 3. fəth etmək; *She has conquered the hearts of many men O, çox kişilərin ürəyini fəth edib; The mountain was not conquered until 1953 1953-cü ilə kimi / qədər dağı fəth edən olmadı (yəni dağın başına qalxan olmadı);* 4. aradan qaldırmaq; tərgitmək; **to ~ bad habits** pis vərdişləri tərgitmək; **to ~ difficulties** çətinlikləri aradan qaldırmaq; 5. cilovlamaq; saxlamaq; **to ~ passion** ehtirası cilovlamaq



**conquered** ['kɔŋkərəd] *adj* istila/fəth edilmiş; **a ~ city/country** istila edilmiş şəhər/ölkə; **~ hearts** fəth edilmiş ürəklər / könüllər
**conquering** ['kɔŋkərıŋ] *adj* istilaçı; **a ~ army** istilaçı ordu; **a ~ country** istilaçı ölkə
**conqueror** ['kɔŋkərəʳ] *n* fateh, istilaçı, istila edən, qalib, qalib gələn; **William the Conqueror** Fateh Vilyam *(İngiltərənin kralı I Vilyam)*
**conquest** ['kɔŋkwest] *n* 1. istila, istila etmə, alma, fəth/zəbt etmə, zorla alma; **the Norman ~** *tar.* Norman İstilası *(1066-cı ildə Normanların İngiltərəni istila etməsi)*; **the ~ of cancer** xərçəngə *(xəstəlik)* qalib gəlmə; **the ~ of outer space** kosmosun fəthi; 2. əldə etmə, qazanma; **to make ~ of** ***smb.*** bir kəsin məhəbbətini qazanmaq
**consanguinity** [.kɔnsæŋ'gwınıtı] *n* qan qohumluğu; **close ties of ~** sıx / yaxın qan qohumluğu
**conscience** ['kɔnʃəns] *n* 1. vicdan; **clear/good ~** təmiz vicdan; **bad/evil ~** çirkli/təmiz olmayan vicdan; **pangs/pricks of ~** vicdan əzabı; **freedom / liberty of ~** vicdan / din azadlığı; **duty in ~** vicdan borcu; **the voice of ~** vicdanın səsi; **for ~('s) sake** vicdanı sakitləşdirmək xatirinə; **in all ~, upon** ***one's*** **~** *d.d.* 1) *Vicdanla danışsaq...;* 2) əlbəttə, şübhəsiz; **to go against** ***one's*** **~** vicdanın ziddinə/əleyhinə getmək; **to act according to** ***one's*** **~** vicdanla hərəkət etmək; **to get** ***smth.*** **off** ***one's*** **~** vicdanını sakitləşdirmək / sakit etmək; *I must go. It's a matter of conscience Mən getməliyəm. Bu vicdan məsələsidir;* 2. şüur, düşüncə, idrak; **public ~** ictimai şüur; *He has a strong social/political conscience Onun güclü ictimai / siyasi şüuru var;*
◊ *A good conscience is a constant feast at.söz.* ≅ *Vicdanı təmiz adam rahat yatar*
**conscienceless** ['kɔnʃənslıs] *adj* vicdansız, vicdanı olmayan, insafsız; həyasız
**conscience-stricken** ['kɔnʃəns.strıkən] *adj* vicdan əzabı çəkən
**conscientious** [.kɔnʃı'enʃəs] *adj* vicdanlı, insaflı, namuslu, düz, səmimi, vicdanla yanaşan *(işə və s.)*; **~ piece of work** vicdanla görülmüş iş; **~ worker** vicdanlı / namuslu fəhlə; **to be ~ in** ***one's*** **duty** öz vəzifəsini vicdanla yerinə yetirmək;
◊ **~ objector** dini və ya başqa səbəbdən hərbi xidmətdən boyunqaçıran şəxs
**conscientiously** [.kɔnʃı'enʃəslı] *adv* vicdanla, insafla, namusla
**conscious** ['kɔnʃəs] *adj* 1. başa düşən, anlayan, dərkedən; **to be ~ of** ***one's*** **guilty** öz günahını / suçunu dərk etmək; **to be ~ of** ***one's*** **folly** axmaq hərəkət etdiyini başa düşmək; *He was conscious that his strength was failing O başa düşürdü ki, onun gücü qurtarır / tükənir; I am quite conscious of his innocence Mən tam/qəti əminəm ki, o günahsızdır;* 2. şüurlu; başa düşən, başa düşməyə qadir olan; huşu / ağlı başında; *He is badly hurt, but still conscious O, bərk zədə alıb, lakin ağlı üstündədir/huşu başındadır;* 3. duyan, hiss edən; **~ of pain / of cold** ağrını / soyuğu hiss edən; 4. düşünən, fikirləşən; *Man is a conscious being İnsan düşünən varlıqdır*
**consciously** ['kɔnʃəslı] *adv* şüurlu olaraq, başa düşə-düşə, qəsdən, bilərəkdən, bilə-bilə
**consciousness** ['kɔnʃəsnıs] *n* 1. şüur, huş, düşüncə, idrak; **to lose ~** huşunu itirmək; **to regain /to recover ~** huşa /özünə gəlmək, ayılmaq; 2. dərk etmə, başa düşmə; **~ of** ***one's*** **guilt / innocence** öz günahını / günahsızlığını dərk etmə, başa düşmə; 3. şüurluluq; 4. özünü dərk etmə; **national ~** milli özünü dərk etmə
**conscript¹** ['kɔnskrıpt] *n* yeni əsgər *(əsgərliyə yeni səfərbər edilmiş şəxs)*
**conscript²** ['kɔnskrıpt] *adj* əsgərliyə/ hərbi xidmətə çağırılan, səfərbərliyə alınmış, səfərbər edilmiş
**conscript³** [kən'skrıpt] *v* hərbi xidmətə çağırmaq, səfərbərliyə almaq
**conscription** [kən'skrıpʃn] *n* 1. hərbi əsgəri borc; 2. hərbi xidmətə çağırış
**consecrate¹** ['kɔnsıkrıt] *adj* = **consecrated**
**consecrate²** ['kɔnsıkreıt] *v* 1. həsr etmək, sərf etmək; **to ~** ***one's*** **life to the service of the country** həyatını ölkəsinə xidmətə həsr etmək; **hours ~d to meditation** tərəddüd / qərarsızlıq içərisində keçən saatlar; 2. müqəddəs saymaq / tutmaq; **to ~ a church** kilsəni müqəddəs saymaq
**consecrated** ['kɔnsıkreıtıd] *adj* 1. həsr edilmiş; 2. əziz tutulmuş, təqdis edilmiş
**consecration** [.kɔnsı'kreıʃn] *n* 1. həsr etmə; **the ~ of** ***one's*** **life to study** ömrünü elmə /oxumağa /təhsilə həsr etmə; 2. əziz tutma, təqdis etmə; **the ~ of a church** kilsəni əziz tutma / təqdis etmə
**consectary** [kən'sektərı] *n* 1. nəticə; xülasə; 2. istintaq
**consecution** [.kɔnsı'kju:ʃn] *n* 1. məntiqi ardıcıllıq; 2. getmə, gediş *(hadisələr haq.)*
**consecutive** [kən'sekjutıv] *adj* 1. sonrakı, ardınca /sonradan gələn; **~ days** sonrakı/ardınca gələn günlər; **on three ~ days: Monday, Tuesday and Wednesday** sonrakı üç gün, bazar ertəsi, çərşənbə axşamı, çərşənbə; 2. ardıcıl, müntəzəm, sistematik; *The numbers 4, 5, 6 are consecutive 4, 5, 6 rəqəmləri ardıcıldır;* 3. *qram.* nəticə; **~ clause** nəticə budaq cümləsi
**consecutively** [kən'sekjutıvlı] *adj* ardıcıllıqla, ardıcıl surətdə, bir-birinin ardınca
**consensus** [kən'sensəs] *n* 1. razılıq, həmrəylik, fikir birliyi, razılaşma; **~ of opinion** fikir birliyi, həmrəylik; **the general ~** ümumi rəy/ fikir; *The two parties have reached a general consensus Bu iki partiya ümumi razılığa gəlmişdir;* 2. *fiziol.* bədənin müxtəlif orqanlarının həmahəng fəaliyyəti
**consent¹** [kən'sent] *n* razılıq, icazə; **to give ~** ra-

zılıq/icazə vermək; **half-hearted** ~ ürəksiz/könülsüz razılıq; **tacit** ~ dinmədən razılıq; **common** ~ ümumi razılıq; **by common** ~ ümumi razılıqla; *He was chosen as leader by common consent O, ümumi razılıqla rəhbər seçildi;* **to win / to obtain** ***smb.'s*** ~ bir kəsin razılığını almaq; **to wring** ~ **from** ***smb.*** bir kəsdən zorla razılıq almaq / əldə etmək; *Her parents refused to give their consent to their marriage Valideynləri onların evlənmələrinə razılıq vermədilər;* **with** ~ **of the author** müəllifin razılığı ilə; **to withhold** ***one's*** ~ razılıq / icazə verməmək; ◊ **age of** ~ həddi-büluğ; *Silence gives consent at.söz.* ≅ *Susmaq razılıq əlamətidir*

**consent²** [kən'sent] *v* razı olmaq, razılıq vermək, razılaşmaq; **to** ~ **to a suggestion** təkliflə razılaşmaq, təklifə razılıq vermək; *He finally consented to go with us O nəhayət bizimlə getməyə razılıq verdi; She consented to marry me O mənimlə evlənməyə razılıq verdi /razı oldu;* **to** ~ **to an operation** operasiyaya/əməliyyata icazə vermək

**consentaneity** [kən͵sentə'nı:tı] *n* yekdillik, müvafiqlik, birlik, uzlaşma

**consequence** ['kɔnsıkwəns] *n* **1.** nəticə; **the** ~**s of an action** hərəkətin nəticələri; **to take the** ~**s of** ***smth.*** bir şeyin nəticəsinə görə məsuliyyət daşımaq; *He was ill, and they had to cancel the trip as a consequence of this O, xəstə idi və bunun nəticəsi olaraq onlar səyahəti dayandırmalı oldular;* **2.** məna, imkan; **a matter of great** ~ böyük mənası olan məsələ; *It is of no consequence Bu, vacib deyil, Bunun mənası yoxdur;* **3.** yüksək vəzifə, mötəbər mövqe, nüfuzlu; **a person of** ~ nüfuzlu / mötəbər şəxs; **in** ~ nəticədə

**consequent** ['kɔnsıkwənt] *adj* **1.** *(bir şeyin)* nəticəsi olan; **his long illness and** ~ **absence from school** onun uzunmüddətli xəstəliyi və onun nəticəsi olaraq dərs buraxması; **the rise in prices** ~ **upon the failure of the crops** məhsulun olmaması nəticəsində qiymətlərin qalxması; **2.** dalınca gələn; ondan sonra gələn; **the** ~ **confusion upon the earthquake** zəlzələdən sonrakı çaxnaşma/həyəcan/vəlvələ; **3.** məntiqi, məntiqi cəhətdən gözlənilən

**consequential** [͵kɔnsı'kwenʃl] *adj* **1.** vacib, əhəmiyyətli; ~ **decision** vacib qərar; **2.** məntiqdən doğan; ~ **amendment** başqa bir düzəliş nəticəsində meydana gələn düzəliş; **3.** iddialı, lovğa; **a** ~ **person** lovğa / iddialı adam

**consequently** ['kɔnsıkwəntlı] *adv* beləliklə, nəticə etibarilə, bu səbəbdən; *My car broke down, consequently I arrived rather later Mənim maşınım sındı, bu səbəbdən də mən xeyli gec gəldim*

**conservancy** [kən'sɜ:vənsı] *n* **1.** gəmiçiliyi və balıqçılıq vətəgələrinin və s. işini tənzimləyən/tənzim edən komitə; **2.** təbiətin mühafizəsi; **The Nature Conservancy Council** Təbiəti Mühafizə Şurası

**conservation** [͵kɔnsə:'veıʃn] *n* **1.** saxlama, saxlanma; mühafizə, mühafizə etmə; qoruma *(nadir heyvanları, meşəni, su hövzələrini, qədim tikililəri və s.)*; **2.** konservləşdirmə *(meyvəni və s.)*

**conservatism** [kən'sɜ:vətızm] *n* **1.** konservatizm, mühafizəkarlıq; **2.** xassənin davamlılığı

**conservative¹** [kən'sɜ:vətıv] *n* **1.** konservativ, mühafizəkar; **to go** ~ konservativ / mühafizəkar olmaq; **2.** konservatorlar / mühafizəkarlar partiyasının üzvü

**conservative²** [kən'sɜ:vətıv] *adj* **1.** mühafizəkar, köhnəliyi sevən, köhnəliyin tərəfdarı; ~ **in tastes / in habits** zövqdə / adət-ənənədə mühafizəkar *(köhnəlik tərəfdarı)*; ~ **tastes in music** musiqidə konservativ zövq; ~ **style of dress** geyimin mühafizəkar üslubu; *Old people are usually more conservative than young people Qoca adamlar cavanlardan daha mühafizəkar olurlar;* **2.** konservatorlar/mühafizəkarlar partiyasına aid *(İngiltərədə)*; **Conservative party** mühafizəkar partiyası; **a** ~ **style** konservativ/mühafizəkar üslub; ~ **voters** mühafizəkarlar partiyasının seçiciləri

**conservatively** [kən'sɜ:vətıvlı] *adv* mühafizəkarcasına, mühafizəkar bir tərzdə / surətdə

**conservatoire** [kən'sɜ:vətwa:ʳ] *n* konservatoriya; *She studied at the Moscow Conservatoire O, Moskva Konservatoriyasında təhsil alıb*

**conservator** [kən'sɜ:vətəʳ] *n* **1.** mühafiz *(muzeylərdə, kitabxanalarda və s. bəzi vəzifələrin adı)*; ~ **of a museum** muzey mühafizi; **2.** təbiəti qoruyan komitənin üzvü

**conservatory** [kən'sɜ:vətrı] *n* **1.** istixana, oranjereya *(bitki yetişdirmək üçün isti yer)*; **2.** *amer. (adət. böyük hərflə yazılır)* konservatoriya

**conserve¹** [kən'sɜ:v] *n (adət. pl)* konservləşdirmə; cem, mürəbbə

**conserve²** [kən'sɜ:v] *v* **1.** saxlamaq, mühafizə etmək; qorumaq; **to** ~ ***one's*** **strength/health** gücünü / sağlamlığını mühafizə etmək/qorumaq; **2.** konservləşdirmək

**consider** [kən'sıdəʳ] *v* **1.** müzakirə etmək, müzakirəyə qoymaq; götür-qoy etmək; **to** ~ **a question / a proposal / a request / a claim** məsələ/təklif/xahiş/iddia müzakirə etmək; *We have considered your application carefully, but cannot offer you the job; Biz sənin/sizin ərizəni/ərizənizi diqqətlə müzakirə etmişik, lakin sənə/sizə iş verə bilmərik;* **a carefully** ~**ed decision / statement / proposal** diqqətlə müzakirə edilmiş/olunmuş qərar/bəyanat/ təklif; **2.** fikirləşmək, ətraflı düşünmək, götür-qoy etmək; *Have you considered how to get there? Sən/Siz ora necə getməyi götür-qoy etmisənmi / etmisinizmi?* **3.** hesab / güman / zənn / fərz etmək, sanmaq; *We consider him (to be) a clever man Biz hesab edirik ki, o ağıllı adamdır; They consider that you are not to blame Onlar hesab edirlər ki, sən/siz günahkar deyilsən/deyilsiniz; I consider myself happy Mən özümü xoşbəxt hesab edirəm; Consider yourself at home Özünü/Özünüzü evindəki /evinizdəki kimi hiss et /edin;* **4.** nəzərə almaq *(bir kəsi)*, hesablaşmaq *(bir kəslə)*; **to** ~ **others** digərləri ilə hesablaşmaq; **to** ~ **the feelings of others** başqalarının hisslərini nəzərə almaq



**considerable** [kən'sıdərəbl] *adj* **1.** böyük, çoxlu, xeyli; ~ **sum of money** böyük məbləğ pul; ~ **distance** böyük məsafə; ~ **income** çoxlu gəlir; ~ **weight** böyük çəki; ~ **expense** xeyli xərc; *I have given considerable thought to the matter Mən bu iş/məsələ barəsində xeyli/çox fikirləşmişəm;* **2.** əhəmiyyətli, mühüm; görkəmli; hörmətli; ~ **citizens** görkəmli vətəndaşlar; **to become** ~ **personage** hörmətli şəxsiyyət olmaq

**considerably** [kən'sıdərəblı] *adv* xeyli; əhəmiyyətli /mühüm dərəcədə; *It's considerably colder this morning Bu səhər xeyli soyuqdur;* ~ **larger** xeyli / əhəmiyyətli dərəcədə böyük

**considerate** [kən'sıdərıt] *adj* diqqətli; iltifatlı; qayğıkeş; ədəbli; ~ **to** ***smb.*** bir kəsə qarşı diqqətli/iltifatlı/qayğıkeş; ~ **towards old people** qoca adamlara qarşı diqqətli / iltifatlı/qayğıkeş; **to be** ~ **towards children** uşaqlara qarşı qayğıkeş /diqqətli olmaq; **a very** ~ **young man** çox iltifatlı / ədəbli gənc

**considerately** [kən'sıdərıtlı] *adv* diqqətlə, iltifatla, ədəblə, qayğıkeşliklə

**considerateness** [kən'sıdərıtnıs] *n* diqqətlilik, iltifatlılıq, ədəblilik, qayğıkeşlik

**consideration** [kən͵sıdə'reıʃn] *n* **1.** baxma, gözdən/nəzərdən keçirmə; müzakirə etmə, müzakirəyə qoyma; **under** ~ müzakirədə; *The question is now under consideration Məsələ indi müzakirə olunur;* **to give a problem** ***one's*** **careful** ~ məsələni diqqətlə müzakirə etmək; **2.** düşünmə, ölçüb-biçmə, götür-qoy etmə, mülahizə, fikir, düşüncə, diqqət; **to take into** ~ nəzərə almaq, diqqət yetirmək; **to leave out of** ~ diqqət/nəzər yetirməmək, nəzərə almamaq, sərf-nəzər etmək; **on/under no** ~ heç vəchlə, qətiyyən; *Several considerations influenced me in coming to a decision Belə bir nəticəyə gəlməyə mənə bir neçə mülahizə təsir göstərdi;* **3.** diqqət, hörmət, iltifat, xoşrəftarlıq, xeyirxahlıq, xoşniyyətlilik; **to show great** ~ **for** ***smb.*** bir kəsə qarşı çox diqqətli / iltifatlı olmaq; **out of** ~ **for his age** onun yaşına hörmət olaraq; **4.** əvəzini vermə, yerini doldurma, kompensasiya, haqq, muzd; **to do** ***smth.*** **for a** ~ əvəzini vermək üçün bir şey etmək; **executed** ~ *hüq.* qarşılıqlı ödəməni yerinə yetirmə; *It's of no consideration at all Bu qətiyyən vacib/lazım deyil*

**considered** [kən'sıdəd] *adj* **1.** düşünülmüş, ağıllı, ətraflı düşünülmüş, götür-qoy edilmiş; ~ **opinion** götür-qoy edilmiş fikir / mülahizə; *It's my considered opinion Bu mənim ətraflı düşünülmüş/götür-qoy edilmiş fikrimdir;* **2.** hörmətli, hörmətəlayiq; **a very highly** ~ **general** çox yüksək hörmətli general

**considering** [kən'sıdərıŋ] *prep* nəzərə alsaq, nəzərə alsanız və s.; *It's excusable considering his age Yaşını nəzərə alsaq, onu bağışlamaq olar; She is very active, considering her age Yaşına görə o çox diribaşdır*

**consign** [kən'saın] *v* **1.** tapşırmaq, himayəsinə vermək; **to** ~ **a child to the care of its teacher** uşağı onun müəlliminin himayəsinə vermək; **to** ~ **the body to the grave** cəsədi torpağa tapşırmaq; **2.** təyin etmək, vermək; **to** ~ **a room to** ***smb.'s*** **use** otağı bir kəsin istifadəsinə vermək; **3.** *tic.* göndərmək, yola salmaq *(malı: satılmaq üçün)*; *The goods were consigned by rail / by ship Mal dəmir yolu ilə / gəmi ilə yola salındı / göndərildi;* **4.** depozitə qoymaq

**consignable** [kən'saınəbl] *adj tic.* göndəriləsi, göndərilməli olan

**consignee** [͵kɔnsaı'nı:] *n tic.* yükalan, adına yük göndərilən adam / idarə və s.

**consigner** [kən'saınəʳ] *n* = **consignor**

**consignment** [kən'saınmənt] *n tic.* **1.** yük; mal partiyası; **new** ~ **of tea** yeni partiya çay; **2.** konsiqnasiya *(xaricə gedən malın mal sahibi hüququna malik olan ticarət agenti vasitəsilə satılması)*; **to take / to send goods on** ~ xaricə gedən malı ticarət agenti vasitəsi ilə göndərmək

**consignor** [kən'saınəʳ] *n tic.* yük/mal göndərən; konsiqnant *(kosiqnasiya üsulu ilə satılan malın sahibi)* komitent *(komissyonerə iş tapşıran adam)*

**consist** [kən'sıst] *v* **1.** **(of)** ibarət olmaq; *The committee consists of ten members Komitə on nəfərdən ibarətdir; Water consists of hydrogen and oxygen Su hidrogendən və oksigendən ibarətdir; The course consists of five subjects Kurs beş fəndən ibarətdir;* **2.** **(in)** müəyyənləşdirmək, müəyyən olunmaq; *National strength consists not only in national armies Ölkənin gücü ancaq onun ordusunun gücü ilə müəyyənləşdirilmir; The beauty of Venice consists in the style of its ancient buildings Venesiyanın gözəlliyi onun qədim binalarının üslubu ilə müəyyənləşir*

**consistency** [kən'sıstənsı] *n* **1.** ardıcıllıq, məntiqlilik; *Your actions lack consistency Sənin/Sizin hərəkətində/hərəkətinizdə məntiq/ardıcıllıq yoxdur; The government's actions completely lack consistency Hökumətin hərəkətlərində əsla ardıcıllıq yoxdur;* **2.** sabitlik, daimilik, dəyişməzlik; **friendship of a lasting** ~ uzunillik/arasıkəsilməyən dostluq; **3.** uyğunluq, uzlaşma, yekdillik; birlik; ~ **of opinions** fikir / rəy birliyi

**consistent** [kən'sıstənt] *adj* **1.** **(with)** uyğunlaşa / birləşə bilən, uyğun; bir yerdə ola bilən, bir

araya sığa bilən; uyğun, münasib; *This is not consistent with that you told me yesterday Sənin/ Sizin dünən mənə dediyinlə / dediyinizlə bu bir araya sığmır;* 2. ardıcıl, məntiqli, əsaslı; *He is not consistent in his actions O, hərəkətlərində ardıcıl deyil;* 3. təsis, təsisedici; ~ **act** təsis aktı
**consistently** [kən'sıstəntlı] *adv* **(with)** uyğun, müvafiq, uyğun /müvafiq olaraq
**consistory** [kən'sıstərı] *n kils.* 1. konsistoriya *(xristianlarda inzibati və məhkəmə hüququna malik ruhani idarəsi);* 2. kilsə məhkəməsi
**consociate**[1] [kən'souʃıɪt] *n* məsləkdaş, yoldaş, şərik, ortaq
**consociate**[2] [kən'souʃıeɪt] *v* 1. şərik etmək /olmaq; 2. birləşdirmək, bağlamaq; 3. birləşmək, əlaqələnmək, əlaqəyə girmək
**consociation** [kən.sousı'eɪʃn] *n* 1. birləşmə, ittifaq; **the ~ of tribes** qəbilələrin birləşməsi/ittifaqı; 2. yoldaşlıq; şirkət, cəmiyyət; 3. xristian kilsələrinin və ya dini icmaların iclası
**consolation**[1] [.kɔnsə'leɪʃn] *n* təsəlli, təskin, təskinlik; təsəlli tapma *(bir şeydən); Music was his only consolation Musiqi onun yeganə təsəllisi idi;* **to afford** ~ təsəlli vermək
**consolation**[2] [.kɔnsə'leɪʃn] *adj* təsəlliverici; ~ **race** təsəlliverici cıdır yarışı *(əvvəlki cıdırda uduzanlar üçün);* ~ **match** *id.* təsəlliverici matç *(əvvəlki yarışda uduzanlar üçün);* ~ **prize** *id.* təsəlliverici priz
**consolatory** [kən'sɔlətərı] *adj* təsəlliverici, təskinlikverici; ~ **words** təsəlliverici/təskin edici sözlər
**console** [kən'soul] *v* təsəlli/təskinlik vermək, təskin/sakit etmək, ovundurmaq
**console-mirror** ['kɔnsoul.mırə] *n* bədənnüma ayna / güzgü
**console table** ['kɔnsoul'teɪbl] *n* divara bərkidilmiş dar stol
**consolidant** [kən'sɔlıdənt] *adj* = **consolidated**
**consolidate** [kən'sɔlıdeɪt] *v* 1. möhkəmlətmək; **to ~ peace / power/ position** sülhü / hakimiyyəti/ mövqeyini möhkəmləndirmək; *Britain is trying to consolidate her position in the North Atlantic Organization Britaniya öz mövqeyini Şimali Atlantika İttifaqında möhkəmlətməyə çalışır;* 2. birləşdirmək; **to ~ territories / banks / armies** ərazilәri / bankları /orduları birləşdirmək; 3. birləşmək, qarışmaq *(cəmiyyətlər, şirkətlər və s. haq.);* 4. toplamaq, cəmləmək, birləşdirmək, ümumiləşdirmək; **to ~ various reports** müxtəlif məlumatları ümumiləşdirmək; 5. *hərb.* möhkəmlənmək *(müəyyən yerdə),* zəbt edilmiş/alınmış mövqeyi möhkəmlətmək; 6. bərkitmək, bərk etmək; 7. bərkimək, bərk olmaq; 8. *mal.* birləşdirmək
**consolidated** [kən'sɔlıdeɪtıd] *adj* 1. birləşdirilmiş, ümumiləşdirilmiş, ümumi; möhkəmləşdirilmiş, qüvvətləndirilmiş; ~ **balance sheet** *müh.* ümumi balans; ~ **return** ümumi məlumat; ~ **index** ümumi göstərici; 2. möhkəmləndirilmiş, bərkidilmiş; sementlənmiş; bərkimiş; ~ **mud** bərkimiş palçıq
**consolidation** [kən.sɔlı'deɪʃn] *n* 1. birləşdirilmə, birləşmə, birlik; 2. möhkəmlətmə; ~ **of peace** sülhü möhkəmləndirmə; 3. sıxlaşdırma, bərkitmə; 4. *geol.* bərkimə
**consommé** [kən'sɔmeı] *n fr.* 1. ət bulyonu / suyu, konsome *(bulyon növü);* 2. ət suyundan hazırlanmış sıyıq / şorba
**consonant**[1] ['kɔnsənənt] *n fon.* samit səs, samit səs ifadə edən hərf
**consonant**[2] ['kɔnsənənt] *adj* 1. **(to)** uyğun, müvafiq, mütabiq; *My opinion is consonant to law Mənim mühakiməm qanuna uyğundur;* 2. **(with)** uyğunlaşa bilən, bir yerdə ola bilən, bir araya sığa bilən; *Your actions do not appear to be consonant with your principles Sənin/Sizin hərəkətin/hərəkətiniz prinsiplərinlə/prinsiplərinizlə bir araya sığmır;* 3. həmahəng, uyğun; ~ **words/syllables** həmahəng sözlər / hecalar
**consort**[1] ['kɔnsɔ:t] *n* 1. *arx.* ər və ya arvad *(xüs. hökmdar);* 2. şahzadə; **the prince ~** kraliçanın əri *(kral olmayan);* 3. qədim havacatlar çalan bir qrup alət və ya musiqiçi; **in ~ with** birlikdə, bir yerdə, bahəm; **acting in ~ with** birgə / bahəm hərəkət etmə
**consort**[2] [kən'sɔ:t] *v* 1. əlaqə saxlamaq, tanışlıq etmək, ünsiyyət saxlamaq, durub-oturmaq; *He'd been consorting with known criminals O, məlum cinayətkarlarla oturub-dururdu/ünsiyyət saxlayırdı;* 2. **(with, to)** uyğun / müvafiq olmaq, düz gəlmək, uyğun/müvafiq olmaq; *It does not consort with his ideas Bu onun fikirləri ilə düz / uyğun gəlmir*
**consortia** [kən'sɔ:tjə] **consortium** *isminin cəm forması*
**consortism** ['kɔnsɔ:tızm] *n biol.* simbioz *(iki orqanizmin bir-birindən istifadə edərək müştərək yaşaması)*
**consortium** [kən'sɔ:tjəm] *n (pl* **-tiums** *və ya* **-tia)** *lat. mal.* konsorsium *(müəyyən maliyyə tədbirlərini həyata keçirmək üçün bir neçə iri bank və ya bankirin inhisarçı birləşməsi)*
**conspectus** [kən'spektəs] *n lat.* konspekt *(bir əsərin, nitqin, məruzənin və s. xülasəsi)*
**conspicuous** [kən'spıkjuəs] *adj* 1. görünən, zahiri, gözəçarpan, aydın, aşkar; ~ **errors** görünən/gözəçarpan səhvlər; *Traffic signs should be conspicuous Yol hərəkət işarələri aydın / aşkar görünməlidir;* **to make oneself ~** diqqəti özünə cəlb etmək, özünü gözə soxmaq *(hərəkəti, geyimi və s.-lə);* ~ **necktie** gözəçarpan qalstuk; 2. məşhur, tanınmış, görkəmli; ~ **statesman** məşhur/tanınmış/görkəmli dövlət xadimi; *He is conspicuous for his bravery O, cəsarəti ilə tanınmışdır / məşhurdur*
**conspicuously** [kən'spıkjuəslı] *adv* görünür, görünür ki, ehtimal ki; gözəçarpacaq qədər, gözə çarpacaq/nəzərəçarpacaq dərəcədə



**conspiracy** [kən'spırəsı] *n* 1. qəsd, sui-qəsd; dilbirlik, əlbirlik *(cinayət işində);* ~ **of silence** bir şey haqqında danışmama/ bir şeyi gizli saxlama; ~ **to overthrow the government** dövləti yıxmaq üçün sui-qəsd; *The police discovered the general's conspiracy to seize control of the government Polis generalın dövlət üzərində nəzarəti ələ almaq üçün təşkil etdiyi sui-qəsdin üstünü açdı;* 2. konspirasiya *(öz fəaliyyətini bildirməmək üçün gizli təşkilatın iş üsulu)*
**conspirator** [kən'spırətə'] *n* sui-qəsdçi, cinayətdə / sui-qəsddə iştirak edən adam
**conspire** [kən'spaıə'] *v* 1. sui-qəsd təşkil etmək /hazırlamaq; **to ~ against** *smb.* bir kəsə qarşı qəsd/sui-qəsd təşkil etmək; 2. birgə/əlbir / birlikdə hərəkət etmək; *Events seemed to be conspiring against him Görünürdü ki, hadisələr onun əleyhinə çevrilib*
**conspirer** [kən'spaıərə'] *n* = **conspirator**
**constable** ['kʌnstəbl] *n* polis, polis nəfəri; **Chief Constable** Polis rəisi *(şəhərdə və ya qraflıqda)*
**constabulary**[1] [kən'stæbjulərı] *n* polis, polis qüvvəsi *(şəhərin, rayonun)*
**constabulary**[2] [kən'stæbjulərı] *adj* polis; ~ **force** polis qüvvəsi
**constancy** ['kɔnstənsı] *n* 1. sabitlik, daimilik, dəyişməzlik; ~ **of purpose** məqsədin sabitliyi / dəyişməzliyi; ~ **of love / of friendship** məhəbbətin /dostluğun daimiliyi; 2. sadiqlik, mətanət, vəfa; **a husband's ~** ər sadiqliyi / vəfası
**constant**[1] ['kɔnstənt] *n riyaz., fiz.* konstanta *(sabit kəmiyyət)*
**constant**[2] ['kɔnstənt] *adj* 1. daimi, həmişəlik; arasıkəsilməyən, aramsız, arasıkəsilməz; ~ **reader** daimi oxucu; ~ **complaints** daimi /arasıkəsilməz şikayətlər; ~ **anxiety** daimi narahatlıq; ~ **chatter** arasıkəsilməz boşboğazlıq /boş söhbət/gap; ~ **rain** aramsız /arasıkəsilməz yağış; ~ **care and attention** daimi qayğı və diqqət; 2. dəyişməz, sabit, dəyişməyən; ~ **current** *el.* sabit cərəyan; 3. dəyişməz, sadiq, həmişəki, sədaqətli, vəfalı; ~ **visitor** həmişəki qonaq; ~ **friend** sədaqətli / vəfalı dost;
◊ *Constant dropping wears away a stone* ≅ Damar-damar, daşı dələr
**Constantinopolitan** [kɔn.stæntınə'pɔlıtən] *adj* Bizans; ~ **style** Bizans üslubu
**constantly** ['kɔnstəntlı] *adv* həmişə, daimi, daima, fasiləsiz, fasiləsiz olaraq, durmadan, aramsız, dalbadal; *The Earth constantly moves around the sun Yer daima / fasiləsiz olaraq günəş ətrafında hərəkət edir; The sun shines constantly Günəş həmişə parlayır*
**constellation** [.kɔnstə'leɪʃn] *n* 1. *astr.* bürc *(ulduzların topası);* 2. pleyada *(bir dövrün, cərəyanın görkəmli xadimlər dəstəsi);* ~ **of genius** dahilər pleyadası
**consternate** ['kɔnstə:neɪt] *v* bərk qorxutmaq, dəhşətə /vahiməyə salmaq
**consternation** [.kɔnstə:'neɪʃn] *n* dəhşət, vahimə, qorxu, hövl; *They looked at each other in consternation Onlar dəhşət / vahimə içərisində bir-birinə baxdılar;* **to cause/to create ~ among people** insanlar /adamlar arasında vahimə yaratmaq
**constipate** ['kɔnstıpeɪt] *v tib.* qəbz olmaq; **to be ~d** qəbz olmaq; *I am constipated again Mən yenə qəbz olmuşam; I constipate very easily, so I can't eat eggs Mən çox asanlıqla qəbz oluram, onun üçün yumurta yemirəm*
**constipated** ['kɔnstıpeɪtıd] *adj* qəbz olmuş / olan, qəbz; *If you are constipated, you should eat more vegetables and fruits Əgər sən/siz qəbz olubsansa/olubsunuzsa, daha çox tərəvəz və meyvə yeməlisən / yeməlisiniz*
**constipation** [.kɔnstı'peɪʃn] *n tib.* qəbz
**constituency** [kən'stıtjuənsı] *n* 1. *top.i* seçicilər; 2. seçki dairəsi; 3. *d.d.* müştərilər, sifarişçilər; 4. *amer. d.d.* abunəçilər
**constituent** [kən'stıtjuənt] *adj* 1. səsvermə hüququna malik, səsvermə hüququ olan, seçici; 2. qanunverici; ~ **assembly** təsis yığıncağı; ~ **power** qanunverici hakimiyyət; 3. tərkib; ~ **part** tərkib hissəsi
**constitute** ['kɔnstıtju:t] *v* 1. təyin etmək; *They constituted him chief adviser Onlar onu baş məsləhətçi təyin etdilər;* 2. yaratmaq, təsis etmək, əsasını/təməlini qoymaq, təşkil etmək; **to ~ a committee** komitə yaratmaq; 3. qüvvəyə mindirmək *(qanunu);* 4. təşkil etmək; *Twelve months constitute a year On iki ay bir ili təşkil edir*
**constitution** [.kɔnstı'tju:ʃn] *n* I 1. konstitusiya, ana yasa, əsas qanun; 2. nizamnamə
**constitution** [.kɔnstı'tju:ʃn] *n* II 1. bədən quruluşu, qədd-qamət; *He has a strong / a robust/a poor constitution Onun sağlam/ möhkəm/zəif bədəni var;* 2. tərkib, quruluş; ~ **of the air** havanın tərkibi
**constitutional** [.kɔnstı'tju:ʃnl] *adj* konstitusiyalı; ~ **government** konstitusiyalı dövlət; ~ **monarchy** konstitusiyalı monarxiya
**constitutionalism** [.kɔnstı'tju:ʃnəlızm] *n* 1. konstitusiyalı idarə; 2. konstitusionalizm *(konstitusiyalı monarxiyanı ən yaxşı idarə üsulu hesab edən mürtəce burjua cərəyanı)*
**constitutionally** [.kɔnstı'tju:ʃnəlı] *adv* konstitusiyaya uyğun olaraq, qanunla, qanunən; *He was not constitutionally appointed Onun təyinatı qanuna ziddir*
**constitutive** ['kɔnstıtju:tıv] *adj* təsisedici, təsis, əməli
**constrain** [kən'streın] *v* 1. məcbur / vadar etmək; **to be ~ed** məcbur olmaq; 2. dayandırmaq, qabağını almaq; saxlamaq; məhdudlaşdırmaq; 3. həbsxanaya salmaq
**constrained** [kən'streınd] *adj* naçar, məcburi, çarəsiz, könülsüz; qeyri-təbii, süni; ~ **smile** süni təbəssüm; ~ **voice** qeyri-təbii səs; ~ **manner** məcburi / qeyri-təbii hərəkət

**constraint** [kən'streɪnt] *n* 1. məcburiyyət, məcbur/vadar etmə; **to act under ~** məcburiyyət altında hərəkət etmək; 2. əl-qolu bağlı olma, bağlılıq, sərbəstlikdən məhrum olma, qeyri-sərbəstlik; sıxılma, utanma; sıxıntı; **~ of money** pul sıxıntısı; **~ of time** vaxt sıxıntısı *(çatmazlığı, azlığı)*; **~ of space** məkan / yer sıxıntısı; *I write to you without any constraint Mən sənə/sizə heç bir sıxıntı çəkmədən yazıram;* **to feel ~ in** *smb.'s* **presence** bir kəsin qarşısında sıxıntı keçirmək/hiss etmək; 3. həbsxana, qala
**constrict** [kən'strɪkt] *v* sıxmaq, daraltmaq; **to ~ muscle** əzələni sıxmaq; **to ~ the blood vessel** qan damarını sıxmaq; *My collar constricts my neck Mənim yaxalığım boynumu sıxır*
**constricted** [kən'strɪktɪd] *adj* dar, sıxılmış, yığılmış *(bir yerə)*, daraldılmış; qısa, müxtəsər; **~ outlook** dar dünyagörüşü; *Our way of life is rather constricted now that our income is so reduced Gəlirimiz xeyli azaldığına görə yaşayışımız / güzəranımız bir qədər çətinləşib*
**constriction** [kən'strɪkʃn] *n* 1. sıxma, daraltma; daralma, sıxılma; **the ~ of the chest** sinənin daralması; **the ~ of life** həyatın daralması; 2. *tib.* tutma, tutub saxlama, sıxıb / çəkib bağlama
**construct** [kən'strʌkt] *v* 1. tikmək; **to ~ a house / a bridge** ev / körpü tikmək; 2. çəkmək *(xətt)*; **to ~ a geometrical figure / a triangle** həndəsi fiqur / üçbucaq çəkmək; *A hut was constructed (out) of branches Daxma budaqlardan tikilib;* 3. yaratmaq, fikirləşmək, düzəltmək; **to ~ a theory** nəzəriyyə yaratmaq; **to ~ a plot of a play** pyesin süjetini düşünüb tapmaq / yaratmaq; **to ~ a model** model düzəltmək; 4. *qram.* qurmaq *(cümlə)*; **to ~ a sentence** cümlə qurmaq
**construction**[1] [kən'strʌkʃn] *n* 1. çəkmə, tikmə, tikinti; **the ~ of a road** yol çəkmə / tikmə; **housing ~** ev tikintisi; **to be under ~** tikilməkdə olmaq; *The new road is still under construction Təzə yol hələ də çəkilməkdədir / çəkilir;* 2. quruluş; bina; *A chair is an object of simple construction Stul sadə quruluşlu əşyadır;* **a complex ~** mürəkkəb quruluş; *The shelter is a brick construction Daldalanacaq kərpicdən tikilmiş binadır;* 3. təhlil, təhlil etmə, izahat, izah etmə; **to put / to place a wrong ~ on** *smb.'s* **action** bir kəsin hərəkətini səhv izah etmək; 4. maşını idarə etmək üçün proqram tərtib etmə; 5. *qram.* quruluş, tərkib; **infinitive ~** məsdər tərkibi
**construction**[2] [kən'strʌkʃn] *adj* tikinti; **~ engineering** tikinti texnikası; **~ plant / site** tikinti meydanı; **~ work** tikinti işləri; **~ firm** tikinti firması; **~ industry** tikinti sənayesi; *My husband works in the construction industry Mənim ərim tikinti sənayesində işləyir*
**constructional** [kən'strʌkʃnl] *adj* 1. tikinti, inşaat; **~ defect** tikinti / inşaat qüsuru; 2. struktur
**constructionism** [kən'strʌkʃənɪzm] *n* konstruktivizm *(ifrat formalizmi ifadə edən burjua cərəyanı)*
**constructionist** [kən'strʌkʃnɪst] *n* konstruktivist
**constructive** [kən'strʌktɪv] *adj* 1. tikinti, konstruksiya; 2. yaradıcı, qurucu; əməli; **~ criticism/policy** yaradıcı tənqid/siyasət; **~ proposal** əməli təklif
**constructively** [kən'strʌktɪvlɪ] *adv* əməli olaraq, yaradıcı tərzdə
**constructor** [kən'strʌktəʳ] *n* 1. konstruktor *(konstruksiya müəllifi)*; 2. inşaatçı
**construe** [kən'stru:] *v* 1. *qram.* cümləni təhlil etmək; 2. *qram.* təhlil olunmaq; *This sentence does not construe Bu cümlə qrammatik baxımdan təhlil olunmur;* 3. *qram.* idarə/tələb etmək *(hal formasını və s.)*; 4. izah etmək; başa düşmək; *You can construe what he said in a number of different ways Onun dediyini müxtəlif cür izah etmək / başa düşmək olar*
**consul** ['kɔnsl] *n* konsul *(bir dövlətin başqa dövlət torpağındakı təbəələrinin hüququnu yerli orqanlar qarşısında müdafiə edən rəsmi nümayəndəsi)*; **The British Consul in Baki** Britaniyanın Bakıdakı konsulu
**consular** ['kɔnsjuləʳ] *adj* konsul; **~ corps** konsul korpusu; **~ convention** konsul konvensiyası *(beynəlxalq saziş, müqavilə)*; **~ fees** konsul rüsumu / vergisi; **~ certificate** konsul şəhadətnaməsi
**consulate** ['kɔnsjulɪt] *n* 1. konsulluq; 2. konsul rütbəsi; 3. konsulun vəzifədə qalma müddəti
**consulate general** ['kɔnsjulɪt 'dʒenərəl] *n* baş konsul
**consulship** ['kɔnsəlʃɪp] *n* konsulluq; konsul vəzifəsi
**consult** [kən'sʌlt] *v* 1. məsləhətləşmək, məsləhət almaq; **to ~ a lawyer / one's friend** vəkildən/dostundan məsləhət almaq, vəkillə / dostu ilə məsləhətləşmək; **to ~ a doctor** həkimə müraciət etmək, həkimə getmək; *If the pain continues, you should consult a doctor Əgər ağrı davam edirsə/kəsməyibsə, sən / siz həkimə müraciət etməlisən/etməlisiniz;* 2. baxmaq *(kitaba və s. məlumat almaq üçün)*, məlumat almaq; **to ~ a map/a dictionary /an encyclopaedia** xəritəyə/lüğətə/ensiklopediyaya baxmaq; 3. **(with)** məsləhətləşmək; **to ~ with** *one's* **chief about a matter** məsələ barədə rəhbərlə məsləhətləşmək; *You must consult your manager before taking a decision Qərara gəlməmişdən əvvəl sən/siz menecerinlə/menecerinizlə məsləhətləşməlisən/məsləhətləşməlisiniz;* 4. nəzərə almaq, diqqət yetirmək; **to ~** *smb.'s* **interests** bir kəsin mənafeyini nəzərə almaq
**consultant** [kən'sʌltənt] *n* 1. konsultant; **an industrial relations ~** sənaye əlaqələri üzrə konsultant; 2. konsultant-həkim; **a ~ surgeon** konsultant-cərrah
**consultation**[1] [ˌkɔnsəl'teɪʃn] *n* konsultasiya; icłas, məşvərət; **legal ~** hüquq konsultasiyası; **in ~ with** məsləhətilə, məsləhət üzrə; **to hold a ~** məsləhətləşmək, gənəşmək; həkimlərin konsiliumu; *The minister of foreign affairs today had consultations with the president of France Xarici işlər naziri bu gün Fransa prezidenti ilə məşvərət keçirdi;* **top-level ~s on trade matters between the American and Chinese delegations** Amerika və Çin nümayəndə heyətləri arasında ticarət məsələlərinə dair keçirilən yüksək səviyyəli müzakirələr



**consultation**[2] [ˌkɔnsəl'teɪʃn] *adj* məsləhət; **~ hours** qəbul saatları; **~ room** həkim kabineti, həkimin qəbul otağı
**consultative** [kən'sʌltətɪv] *adj* məsləhətçi, məşvərətçi, konsultativ; **~ committee** məşvərətçi / konsultativ komitə; **~ voice** məşvərətçi səs
**consulting** [kən'sʌltɪŋ] *adj* məsləhətverən, məsləhətçi; **~ physician** müalicə edən həkim; həkim-məsləhətçi; **~ engineer** məsləhətçi mühəndis, mühəndis-məsləhətçi; **~ hours** qəbul saatları *(həkimin və s.)*; **~ room** həkimin qəbul otağı
**consume** [kən'sju:m] *v* 1. qırmaq, məhv / tələf etmək, yoxa çıxarmaq, aradan qaldırmaq; *The fire soon consumed the wooden hut Yanğın tezliklə ağac/ağacdan tikilmiş komanı məhv etdi;* 2. yemək, yeyib içmək; *He consumed everything that was put before him O, qarşısına/qabağına qoyulmuş nə vardısa hamısını yedi;* 3. sərf / israf etmək, boş yerə xərcləmək, dağıtmaq; **to ~** *one's* **money** pulunu boş yerə xərcləmək; *He consumed all his money on women and drink O, bütün pulunu qadınlara və içkiyə sərf etdi;* 4. bürümək, çulğamaq; boğmaq; *He is consumed with hatred Nifrət hissi onu boğur; He is consumed with grief / with envy O, kədərdən / qibtədən alışıb yanır*
**consumer** [kən'sju:məʳ] *n* 1. istehlakçı, müştəri, sərf edən; 2. abunəçi
**consumership** [kən'sju:məʃɪp] *n iqt.* xalq istehlakı
**consummate**[1] [kən'sʌmɪt] *adj* çox gözəl / yaxşı/qəşəng, əla, kamil, mükəmməl, ali, nöqsansız, bitmiş; **~ taste** çox yaxşı / gözəl zövq; **~ happiness** tam xoşbəxtlik; **a ~ performance** kamil tamaşa
**consummate**[2] ['kɔnsʌmeɪt] *v* 1. tamamlamaq, başa çatdırmaq, qurtarmaq; 2. *arx.* təkmilləşdirmək; 3. kəbin əlaqəsini tamamlamaq *(cinsi əlaqədə olmaqla)*
**consummation** [ˌkɔnsʌ'meɪʃn] *n d.d.* 1. qurtarma, tamamlama; başa çatdırma; **the ~ of work** işi tamamlama / başa çatdırma; 2. kəbin əlaqələrini həyata keçirmə *(yəni cinsi əlaqədə olma)*; 3. son, axır, qurtaracaq; 4. nail olma, çatma, əldə etmə *(məqsəd və s. haq.)*; **the ~ of** *one's* **ambitions** arzularına çatma
**consumption** [kən'sʌmpʃn] *n* 1. işlətmə, sərf/istehlak etmə; istehlak; **~ of food** ərzağın işlənməsi; **home ~** daxili istehlak; **per capita ~** adambaşına istehlak; *The meat was declared unfit for human consumption Ət insanların istifadə etməsi / istehlakı üçün yararsız elan edildi;* 2. *tex.* işlətmə, sərf etmə *(yağ, yanacaq və s.)*; *Gas and oil consumption always increases in cold weather Soyuq havada qaz və benzin çox işlədilir;* 3. *tib.* vərəm, ciyərlərin vərəmi; 4. solma, saralma *(xəstəlikdən)*
**consumptive** [kən'sʌmptɪv] *adj* vərəmli; vərəm xəstəliyinə tutulan, vərəm xəstəliyi olan
**cont** [kɔnt] *n* 1. **containing**; 2. **contents**; 3. **content**; 4. **continued** *sözlərinin əvəzinə işlənən qısa forma (yazıda)*
**contact**[1] ['kɔntækt] *n* 1. əlaqə, rabitə; təmas; **to come in/into ~ with** *smb.* bir kəslə əlaqəsi olmaq; *Have you been in contact with your brother? Sənin / Sizin qardaşınla / qardaşınızla əlaqən /əlaqəniz varmı?* **to make ~** əlaqə yaratmaq; *Our generals have made contact with the enemy and asked for peace Bizim generallar düşmənlə əlaqə yaradıb sülh təklif etdilər; This poor madman has lost all contact with reality Bu yazıq dəli kişi həyatla bütün əlaqəsini itirib (yəni ətrafda nə baş verdiyini dərk etmir);* **diplomatic/cultural ~s** diplomatik/mədəni əlaqələr; *There is no diplomatic contact between these two countries Bu iki ölkə arasında heç bir diplomatik əlaqə yoxdur;* **to make useful social ~s in society** cəmiyyətdə faydalı əlaqələr yaratmaq; 2. basildaşıyan, basilyayan; 3. *el.* kontakt *(elektrik xətlərinin bir-birinə toxunduğu yer / nöqtə)*; 4. *kim.* katalizator *(kimyəvi reaksiyaları sürətləndirən və ya yavaşıdan maddə)*
**contact**[2] ['kɔntækt] *adj*: **~ number** əlaqə saxlamaq üçün telefon nömrəsi; **~ man** *d.d.* vasitəçi, araçı, aradüzəldən *(adam)*
**contact**[3] [kən'tækt] *v* 1. əlaqəyə girmək, əlaqə yaratmaq *(telefonla)*, əlaqə saxlamaq; *He succeeded in contacting the secretary Katibə ilə əlaqə yaratmaq ona müyəssər oldu;* 2. *el.* qoşmaq, birləşdirmək; 3. *tex.* işə salmaq
**contact-breaker** ['kɔntækt.breɪkəʳ] *n* rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*
**contagion** [kən'teɪdʒn] *n* 1. yoluxma, yoluxucu xəstəlik; 2. *məc.* yayılma; *A contagion of fear seems to be spread all through the city Görünür, qorxu bütün şəhərə yayılıb*
**contagious** [kən'teɪdʒəs] *adj* 1. yoluxucu, yoluxan; **~ disease** yoluxucu/yoluxan xəstəlik; *Scarlet fever is highly contagious Skarlatin çox keçicidir;* 2. *məc.* sirayətedici, başqalarına keçən; **~ laughter** sirayətedici gülüş; *Yawning is contagious Əsnək sirayətedicidir*
**contain** [kən'teɪn] *v* 1. *(davamedici zamanda işlənmir)* olmaq, daxilində olmaq, ehtiva etmək; *This book contains a great deal of useful information Bu kitabda çoxlu faydalı məlumat var;*

*The atlas contains forty maps Bu atlasda qırx xəritə var;* 2. tutmaq, yerləşmək; *This barrel contains 50 litres Bu çəlləl 50 litr tutur; The hall cannot contain all the members of the club Bu zal klubun bütün üzvlərini tutmur;* 3. saxlamaq, cilovlamaq; **to ~ one's anger** acığını cilovlamaq; **to ~ one's laughter** gülməyini saxlamaq; 4. *riyaz.* qalıqsız bölünmək; 5. *hərb.* dayandırmaq, qabağını almaq; *Government forces have failed to contain the rebellion Hökumət qüvvələri üsyanın qarşısını ala bilmədi*

**container** [kən'teınə^r] *n* 1. qab *(qutu, butulka və s.); Food will last longer if stored in an airtight container Hava keçirməyən qabda saxlanılan ərzaq uzun müddət xarab olmaz;* 2. konteyner *(qatarla, təyyarə ilə, gəmi ilə yük daşımaq üçün standart tutumlu böyük dəmir qutu);* 3. rezervuar, çən *(maye və ya qaz saxlamaq üçün)*

**containment** [kən'teınmənt] *n* 1. saxlama; 2. qarşısını alma siyasəti *(təcavüzkarın, istilaçının və s.)*

**contaminate** [kən'tæmıneıt] *v* 1. çirkləndirmək; bulamaq; batırmaq; **to ~ a river with waste** çayı (axar) tullantılarla çirkləndirmək; 2. yoluxdurmaq; infeksiya salmaq; *Flies contaminate food Milçəklər ərzağa infeksiya salır;* 3. korlamaq *(şüuru və s.); They are contaminating the minds of our young people with these subversive ideas Onlar bizim gənclərin şüurunu təxribatçı fikirlərlə korlayırlar*

**contaminated** [kən'tæmıneıtıd] *adj* zəhərlənmiş, zəhərli, çirklənmiş; **~ ground / area** *hərb.* zəhərlənmiş torpaq / ərazi; **a river ~ by chemicals** kimyəvi tullantılarla çirklənmiş çay; **~ drinking water** çirklənmiş içməli su

**contamination** [kən.tæmı'neıʃn] *n* 1. çirklənmə *(həm də radioaktiv);* **~ of water /of air** suyun/havanın çirklənməsi; **radioactive ~** radioaktiv çirklənmə; 2. korlanma, korlama, xarab etmə/olma; çürümə; 3. murdarlama, ləkələmə, təhqir etmə; 4. *dilç.* kontaminasiya *(iki forma və ya ifadə vasitələrinin birləşməsilə yeni forma və ya ifadənin əmələ gəlməsi)*

**contemn** [kən'tem] *v* nifrət etmək, xor / həqarətlə baxmaq, zəhləsi getmək; etina etməmək, məhəl qoymamaq, laqeydlik göstərmək *(qanuna və s.)*

**contemplate** ['kɔntempleıt] *v* 1. tamaşa/ seyr etmək, baxmaq; *She stood contemplating herself in the mirror O, güzgünün önündə dayanıb özünə tamaşa edirdi;* 2. düşünmək, fikirləşmək, götür-qoy etmək; *The doctor contemplated the difficult operation he had to perform Həkim etməli olduğu cərrahiyyə əməliyyatı haqqında fikirləşdi/götür-qoy etdi;* **to ~ a problem** problemi müzakirə etmək/müzakirəyə qoymaq / nəzərdən keçirmək; 3. fikrində /niyyətində/qəsdində olmaq; *He contemplates going to London next week O, gələn həftə London ona getmək fikrindədir;* 4. gözləmək; *I don't contemplate any opposition from him Onun mənə qarşı müxalifətdə duracağını gözləmirəm*

**contemplation** [.kɔntem'pleıʃn] *n* 1. seyr / tamaşa etmə; *He stood in silent contemplation of the scene before him O dayanıb sakit bir vəziyyətdə qarşısındakı mənzərəni seyr edirdi;* 2. dərin düşüncə / fikir, fikrə getmə; tərəddüd; *He sat in deep contemplation O, dərin fikrə dalaraq oturmuşdu;* **to have a new school in ~** yeni məktəbin açılmasını götür-qoy etmək; 3. niyyət, məram, məqsəd; **to have *smth.* in ~** bir şey etmək fikrində/niyyətində olmaq; *In contemplation of returning at an early day he left O, tezliklə qayıtmaq məqsədilə getdi;* 4. gözləmə

**contemplative** ['kɔntempleıtıv] *adj* fikirli, dalğın; **~ person** fikirli / dalğın adam; **~ look** dalğın baxış

**contemporaneous** [kən.tempə'reınjəs] *adj* 1. müasir, çağdaş; **~ styles in women's clothing** qadın geyimində müasir / çağdaş dəb; 2. *(çox vaxt* **with** *sözönü ilə işlədilir)* eynivaxtlı, eynizamanlı; **~ events** eyni vaxtda / eyni zamanda baş verən / vaqe olan hadisələr; **~ developments** eynivaxtda baş verən hadisələr

**contemporaneously** [kən.tempə'reınjəslı] *adv* bir vaxtda, eyni zamanda

**contemporaneousness** [kən.tempə'reınjəsnıs] *n* 1. müasirlik; 2. eyni zamanda / vaxtda olma, bir vaxta təsadüf etmə, bir vaxtda olma

**contemporary**[1] [kən'temprərı] *n* 1. həməsr, müasir, bir dövrün/zamanın / əsrin adamı *(təxminən eyni yaşlı adamlar); Petrarch and Chaucer were contemporaries Petrarka və Çoser müasir/həməsr idilər;* 2. həmyaş, yaşdaş, yaşıd; *John is my contemporary; we are both 60. Con mənim həmyaşıdımdır/yaşıdımdır; biz hər ikimiz 60 yaşındayıq;* 3. müasir dövrdə yaşayan adam; *Is this composer a contemporary? Bu bəstəçi / bəstəkar müasirdirmi? (yəni indi yaşayırmı?)*

**contemporary**[2] [kən'temprərı] *adj* müasir, həməsr; **~ writers/literature** müasir yazıçılar /ədəbiyyat; **~ English** müasir ingilis dili; **~ society** müasir cəmiyyət; **~ fashions/dance /theatre/furniture** müasir dəblər / rəqs / teatr / mebel; *Dickens was contemporary with Thackeray Dikens Təkəreyin müasiri idi*

**contempt** [kən'tempt] *n* 1. nifrət; **to feel ~ for a liar** yalançıya nifrət bəsləmək/etmək; **to have / to hold *smb.* in ~** bir kəsə nifrət etmək/bəsləmək; *I feel nothing but contempt for people who treat children so cruelly Uşaqlarla belə qəddar rəftar edən adamlara mən ancaq və ancaq nifrət edirəm/bəsləyirəm;* **to bring ~ upon oneself, to fall into ~** özünə qarşı nifrət oyatmaq; 2. *hüq.* hörmətsizlik *(məhkəməyə və s.);* təhqir etmə *(dövlət orqanlarını və s.);* **direct ~** məhkəməni təhqir etmə *(birbaşa məhkəmədə);* **~ of Congress** *amer.* konqresə hörmətsizlik; 3. məhkəmənin göstərişini yerinə yetirməmə; **~ of the law** qanunu pozma, qanuna riayət etməmə; **~ of court** məhkəməyə gəlməmə, məhkəmənin göstərişini yerinə yetirməmə;

◊ **in ~ of** baxmayaraq, əksinə, zidd olaraq; *He rushed forward in contempt of danger Təhlükəyə baxmayaraq o irəli atıldı*

**contemptible** [kən'temptəbl] *adj* mənfur, nifrət ifadə edən/oyadan, həqarətli; alçaq; **~ fellow** alçaq/rəzil adam; **~ conduct** alçaq/rəzil/mənfur davranış; **~ action** alçaq/rəzil/nifrət oyadan hərəkət; **a ~ trick** alçaq/həqarətli zarafat; *That was a contemptible trick to play on a friend O, dosta qarşı edilən alçaq / həqarətli bir zarafat idi*

**contemptuous** [kən'temptʃuəs] *adj* nifrətli, həqarətli, nifrət ifadə edən; lovğa, təşəxxüslü, təkəbbürlü, iddialı, mütəkəbbir; **~ look** lovğa / təkəbbürlü/iddialı/təşəxxüslü baxış; **~ remark** nifrət ifadə edən irad; **~ manner** iddialı / təşəxxüslü / təkəbbürlü davranış; **a ~ person** iddialı/lovğa təkəbbürlü adam; *He threw the book away with a contemptuous gesture O, kitabı təkəbbürlü bir hərəkətlə kənara tulladı*

**contemptuously** [kən'temptʃuəslı] *adv* təşəxxüslə, təkəbbürlə, lovğalıqla, lovğa-lovğa; iddialı / lovğa / həqarətli bir tərzdə

**contend** [kən'tend] *v* 1. mübarizə aparmaq, çarpışmaq, vuruşmaq; **to ~ for truth** həqiqət uğrunda mübarizə aparmaq/çarpışmaq; **to ~ with difficulties** çətinliyə qarşı mübarizə aparmaq; 2. yarışmaq, rəqabət aparmaq; *Several teams are contending for the prize Bir neçə komanda priz / mükafat uğrunda mübarizə aparır;* 3. mübahisə etmək; deyişmək, sözə gəlmək; **to ~ against the opponents** rəqiblə mübahisə etmək; *He is ready to contend about everything O hər şey haqqında mübahisə etməyə hazırdır;* 4. təkid/israr etmək; sözünün üstündə durmaq, təsdiq etmək; əsaslandırmaq, bildirmək, məlumat/xəbər vermək, elan / bəyan etmək

**contender** [kən'tendə^r] *n* rəqib; iddiaçı, iddia / tələb edən; **~ to the title** *id.* çempion adının iddiaçısı / adını iddia edən

**contending** [kən'tendıŋ] *adj* zidd, bir-birinə zidd olan; **~ interests** zidd / bir-birinə zidd olan maraqlar / mənafelər

**content**[1] ['kɔntent] *n* I 1. ...da, ...də, içindəki,... içində olan şey; **the ~s of a bag / of a pocket** çantanın / cibin içindəkilər; 2. məğz, mahiyyət, əsas məzmun; **the ~ of a proposition / a speech / a book / an article** təklifin/nitqin /kitabın /məqalənin məzmunu / məğzi; **form and ~** forma və məzmun; *I like the style of this book but I don't like the content Mənim bu kitabın üslubundan xoşum gəlir, lakin onun məzmununu xoşlamıram;* 3. həcm, tutum; **the ~ of a barrel** çəlləyin tutumu

**content** [kən'tent] *n* II 1. məmnunluq, məmnun olma, məmnuniyyət, razılıq, razı qalma; **to *one's* heart's ~** istədikcə, istədiyi qədər; doyunca, bol-bol, ürəyi istədiyi qədər; **to live in peace and ~** əmin-amanlıq və bolluq içərisində yaşamaq; 2. "lehinə səs"; **not ~** "əleyhinə səs" *(Lordlar Palatasında);* 3. Lordlar Palatasının təklifə səsverən üzvü

**content**[2] [kən'tent] *adj* 1. xoşhal, məmnun; razı olan / qalan; **~ with food** yeməkdən razı olan / qalan; *He is content with very little O, aza da qaildir;* 2. qane, razı; *I am content to remain at home Mən evdə qalmağa razıyam; He wasn't content to live a quiet life in a small town Balaca bir şəhərdə sakit həyat sürmək onu qane etmirdi;* 3. təklifə səs verən *(Lordlar Palatasında)*

**content**[3] [kən'tent] *v* 1. razı salmaq, qane etmək; *My apology appeared to content her Mənim üzr istəməyim göründü ki, onu razı saldı;* 2. **to ~ oneself *(with)*** kifayətlənmək, qənaətlənmək, razı düşmək, qane olmaq; *You will have to content yourself with what you have Nə varsa sən /siz ona qane olmalı olacaqsan/olacaqsınız*

**contented** [kən'tentıd] *adj* razı, məmnun, xoşhal; xoşnud; **~ look / smile** razı baxış / təbəssüm

**contentedness** [kən'tentıdnıs] *n* razılıq, məmnunluq, məmnuniyyət, razı/məmnun qalma

**contention** [kən'tenʃn] *n* 1. çəkişmə, ixtilaf, nifaq, ədavət; narazılıq, mübahisə; *This is not a time for contention Mübahisə vaxtı deyil;* 2. baxış, nöqteyi-nəzər, fikir; *His contention was that... Onun fikri / nöqteyi-nəzəri belədir ki,... It's my contention that you are wrong, and I shall try to prove it Mənim fikrim/nöqteyi-nəzərim belədir ki, sən/siz səhv edirsən/edirsiniz, mən bunu sübut etməyə çalışacam*

**contentious** [kən'tenʃəs] *adj* 1. mübahisə etməyi sevən; deyingən, dalaşqan; hər şeyə bəhanə axtaran/irad tutan, öcəşkən; **~ temper** deyingən / öcəşkən xasiyyət; 2. mübahisəli, mübahisə doğuran / yaradan; **a ~ clause in a treaty** müqavilənin mübahisəli / mübahisə doğuran maddəsi; **~ issue** mübahisəli məsələ; **~ point** mübahisəli bənd *(müqavilədə)*

**contentiously** [kən'tenʃıəslı] *adv* öcəşkəncəsinə, deyingənliklə, deyingəncəsinə; höcət bir tərzdə, höcətliklə, davakarlıqla

**contentiousness** [kən'tenʃıəsnıs] *n* deyingənlik, davakarlıq, dalaşqanlıq, öcəşkənlik, bəhanə axtarma / tapma, yersiz irad tutma xasiyyəti

**contentment** [kən'tentmənt] *n* razılıq, razı qalma /olma; məmnunluq, məmnuniyyət, məmnun qalma; bolluq, rifah; xoşbəxtlik

**contents** ['kɔntents] *n* mündəricat, kitabın içindəkilər; **the ~ of a book** kitabın mündəricatı

**contest**[1] ['kɔntest] *n* 1. mübahisə; 2. mübarizə, yarış; **a ~ for the leadership of the party** partiyada rəhbərlik uğrunda mübarizə; **international**

~ beynəlxalq yarış; **a boxing/an archery/dancing/beauty ~** boks / oxatma / rəqs / gözəllik yarışı; *The election was so one-sided that it was really no contest Seçki elə birtərəfli idi ki, orada əslində heç bir mübarizə / yarış yox idi;* 3. konkurs; **musical ~** musiqi konkursu

**contest**[2] [kən'test] *v* 1. etiraz etmək, razı olmamaq, qəbul etməmək; **to ~ a point / a right / a statement** bəndi / hüququ / bəyanatı qəbul etməmək, bəndə / hüquqa /bəyanata etiraz etmək; 2. mübarizə aparmaq; **to ~ every inch of ground** torpağın hər qarışı uğrunda mübarizə aparmaq; 3. yarışda iştirak etmək; rəqabət aparmaq; **to ~ a match / a race** yarışda / cıdırda iştirak etmək; 4. *hüq.* şahid sifətində dəvət etmək / çağırmaq *(bir kəsi)*

**contestant** [kən'testənt] *n* 1. rəqib; 2. yarış iştirakçısı, yarışda iştirak edən, iştirakçı; *There were 50 contestants from all parts of the country in this dancing competition Bu rəqs yarışında ölkənin bütün yerlərindən 50 nəfər iştirakçı vardı*

**context** ['kɔntekst] *n* 1. kontekst *(mətnin mənaca bitmiş olan hissəsi); Can't you guess the meaning of the word from the context? Sən/Siz bu sözün mənasını kontekstdən başa düşə bilmirsən/bilmirsiniz? In some contexts* **mad** *means* **foolish**, *in some* **angry**, *and in others* **insane** **Mad** *sözü bəzi kontekstdə* **səfeh**, *bəzisində* **acıqlı** *və digərlərində isə* **dəli** *mənası kəsb edir;* 2. vəziyyət, şərait, hadisələrin gedişi; **in the ~ of to-day's Russia** Rusiyanın hazırki/bugünkü vəziyyətində; *In the context of the present economic crises it seems unwise to lower taxes Müasir iqtisadi böhran şəraitində vergiləri azaltmaq ağılsızlıq olar*

**contextual** [kən'tekstʃuəl] *adj* kontekst, kontekstual, kontekstlə əlaqədar (olan); **the ~ meaning of the word** sözün kontekstual/kontekstlə əlaqədar olan mənası; *This word has a special contextual meaning here Bu söz burada xüsusi kontekstual mənaya malikdir*

**contextually** [kən'tekstʃuəlı] *adv* mətnlə əlaqədar olaraq, kontekstual şəkildə/tərzdə; **~ use of the word** sözün kontekstlə əlaqədar olaraq işlənməsi

**contexture** [kən'tekstʃəʳ] *n* 1. toxuma, hörmə, toxunma, hörülmə; 2. hadisələrin və s. bir-birinə qarışması; dolaşıqlıq; **~ of truth and lies** həqiqət və yalanların bir-birinə qarışması; 3. ədəbi əsərin quruluşu, kompozisiya; 4. **= context** *(1-ci mənada)*

**conticent** ['kɔntısənt] *adj* dinməz, danışmaz, sakit, azdanışan

**contiguity** [,kɔntı'gju:ıtı] *n* qonşuluq, həmhüdudluq, yanaşılıq, bitişiklik, təmas, əlaqədarlıq, yaxınlıq

**contiguous** [kən'tıgjuəs] *adj* qonşu, həmhüdud, yanaşı; yapışıq, bitişik; həmsərhəd, eyni sərhədi olan; *The corn-field is contiguous to our garden Taxıl zəmisi bizim bağın yaxınlığındadır/bağla həmsərhəddir; England is the only country contiguous to / with Wales İngiltərə Uelslə həmsərhəd olan yeganə ölkədir*

**continence** ['kɔntınəns] *n* 1. təmkinlilik, səbirlilik, təmkin; **~ in speech** nitqdə təmkinlilik; 2. özünü/nəfsini saxlaya bilmə, çəkinmə *(xüs. cinsi əlaqədə olmadan)*

**continent**[1] ['kɔntınənt] *n* materik, kontinent, qitə *(qurunun əsas hissələrindən biri); Africa is a continent, Greenland is not Afrika materikdir/qitədir, Qrenlandiya yox;* **the Continent** Avropa qitəsi; ◊ **the dark ~** *arx.* "qara qitə", Afrika

**continent**[2] ['kɔntınənt] *adj* 1. təmkinli, səbirli; 2. özünü/nəfsini saxlaya bilən, çəkinən *(xüs. cinsi əlaqədən)*, əxlaqlı, ismətli, bakir, təmiz, saf

**continental**[1] [,kɔntı'nentl] *n* 1. Avropa qitəsi sakini, ingilis olmayan; *She met a charming continental while on holiday İstirahətdə olanda o, cazibədar bir avropalı ilə tanış oldu;* 2. *amer. tar.* müstəqillik müharibəsi dövrünün əsgəri; 3. *amer. tar.* müstəqillik müharibəsi dövrünün kağız pulu;
◊ **not worth a ~** *amer.* bir quruşa/ qəpiyə dəyməz, faydasız

**continental**[2] [,kɔntı'nentl] *adj* 1. kontinental; **~ climate** kontinental iqlim; **~ glacier** kontinental buz örtüyü; 2. Avropa qitəsinə /materikinə aid olan; **~ wars** Avropa müharibələri; **~ alliance** Avropa ittifaqı; **~ Germanic tribes / dialects** kontinental alman qəbilələri/dialektləri; 3. *amer. tar.* müstəqillik müharibəsi dövründə müstəmləkələrə və ya ilk ştata aid olan

**continentalism** [,kɔntı'nentəlızm] *n* Avropa qitəsinə/materikinə xas olan həyat tərzi, adət, ənənə və s. *(Britaniya adalarından fərqli olaraq)*

**continently** ['kɔntınəntlı] *adv* 1. təmkinlə, səbirlə, özünü/nəfsini saxlayaraq; 2. ismətlə, əxlaqlı bir tərzdə

**contingency** [kən'tındʒənsı] *n* 1. mümkünlük, ehtimal, yəqinlik, həqiqətə uyğunluq; 2. hadisə, təsadüf, gözlənilməyən vəziyyət; **fatal ~** faciəli/fəlakətli/bədbəxtlik gətirən hadisə; **unforeseen ~** gözlənilməyən təsadüf; *All kinds of contingencies might arise Hər cür gözlənilməz vəziyyət yarana/baş verə bilər; This unexpected contingency upset all our plans Bu gözlənilməz hadisə bizim bütün planlarımızı alt-üst etdi; We must be ready for any contingency Biz hər cür təsadüfə hazır olmalıyıq*

**contingent**[1] [kən'tındʒənt] *n* 1.**= contingency**; 2. pay, proporsional miqdar *(iştirakçılar və s. arasında);* **the British ~ at the Olympic games** Olimpiya oyunlarında iştirak edən britaniyalılar; 3. *hərb.* şəxsi heyət qrupu, şəxsi heyət, kontingent; **a small British ~ in the UNO peace-keeping force** BMT-nin asayişi qoruyan qüvvələrinin tərkibində Britaniyanın kiçik kontingenti; 4. yığıncaqda/konfransda iştirak edən qrup; *A large contingent from Japan was present at the conference Konfransda Yaponiyadan böyük nümayəndə qrupu iştirak edirdi*



**contingent**[2] [kən'tındʒənt] *adj* 1. mümkün, mümkün ola bilən; ağlagələn; 2. təsadüfi, gözlənilməz; qabaqcadan nəzərə alına bilməyən; **~ expenses** qabaqcadan nəzərdə tutulmayan/nəzərə alınmayan xərclər; **uncertain and ~ causes** qeyri-müəyyən və qabaqcadan nəzərə alınmayan öhdəlik /səbəblər; 3. vəziyyətdən və s. asılı olan; **peace ~ upon compliance with the proffered terms** təklif edilən şərtdən asılı olan sülh

**contingently** [kən'tındʒəntlı] *adv* şərti, şərti olaraq

**continual** [kən'tınjuəl] *adj* 1. arasıkəsilməyən, arasıkəsilməz, fasiləsiz, aramsız, dalbadal, təkrar olunan; **~ rain** arasıkəsilməyən / aramsız / fasiləsiz yağış; **~ flashes of lightning** şimşəyin dalbadal çaxması; **~ bouts of toothache** təkrar olunan diş ağrısı; 2. daim, daima; **a ~ increase in output of animal products** heyvandarlıq məhsullarının daim / daima artması; *The company receives continual complaints about the quality of its products Kompaniya məhsullarının keyfiyyəti haqqında daim/daima şikayətlər alır*

**continually** [kən'tınjuəlı] *adv* 1. dəfələrlə, dönədönə; *I continually have to remind him of his responsibilities Mən ona məsuliyyəti haqqında dönə-dönə xatırlatmalı oluram;* 2. həmişə, daim, daima; *They're continually arguing Onlar həmişə/daim/daima mübahisə edirlər*

**continuance** [kən'tınjuəns] *n* 1. sürəklilik, davam; müddət, uzunluq; ardı, davamı; **during the ~ of the war** dava / müharibə müddətində; *The continuance of this drought will ruin the harvest Quraqlığın belə davam etməsi məhsulu məhv edəcək;* 2. *hüq.* məhkəmə işinin baxılmasının təxirə salınması; 3. *arx.* ardıcıllıq, varislik

**continuation** [kən,tınju'eıʃn] *n* 1. davam, davam etdirmə/etmə; ardı, davamı; **~ of a story/of an article** hekayənin/məqalənin davamı/ardı; *The Baltic Sea is a continuation of the North Sea Baltik dənizi Şimal dənizinin davamıdır;* 2. yenidən başlama, təzələmə; **~ of the studies after the holidays** tətildən / kanikuldan sonra yenidən dərslərə başlama; 3. əlavə etmə

**continue** [kən'tınju:] *v* 1. davam etdirmək / etmək; **to ~ work / the trip** işi / səyahəti davam etdirmək; *How can you continue to work/working with all that noise going on? Sən / Siz bu səs-küydə işi / işləməyi necə davam etdirirsən / etdirirsiniz? The fighting around the airport continued for a week before we defeated the enemy Biz düşməni məğlub edənədək vuruşma aeroportun ətrafında bir həftə davam etdi; After a short break the play continued Qısa fasilədən sonra tamaşa davam etdi;* 2. işdə saxlamaq, vəzifədə saxlamaq; *The king decided to continue John as minister Kral Conu nazir vəzifəsində saxlamağı qərara aldı;* 3. qalmaq *(əvvəlki vəziyyətdə);* **to ~ in power/at one's post** hakimiyyətdə / öz vəzifəsində qalmaq; *She still continues in weak health O, hələ də xəstədir;* 4. davam etdirilmək; *The story will be continued in our next issue Hekayə gələn sayımızda davam etdiriləcək;* **to be ~d** arxası /ardı var; 5. uzanmaq; *The road continues for miles Yol bir neçə mil uzanır; The desert continues as far as eye could reach Səhra göz işlədikcə uzanır;* 6. *hüq.* işə baxmağı təxirə salmaq

**continued** [kən'tınju:d] *adj* davam edən, arasıkəsilməyən; aramsız, daimi, daima; **~ opposition** daimi müxalifət; **~ resistance** daimi müqavimət; **~ fraction** *riyaz.* sonsuz kəsir

**continuer** [kən'tınjuəʳ] *n* davamçı, davametdirən

**continuing** [kən'tınjuıŋ] *adj* davamedən, arasıkəsilməz, aramsız; daimi; **~ discussions** arasıkəsilməz / aramsız müzakirə; **~ success** arasıkəsilməz müvəffəqiyyət / nailiyyət; **~ uncertainty** daimi / aramsız əminsizlik

**continuity** [,kɔntı'nju:ıtı] *n* 1. arasıkəsilməzlik, fasiləsizlik, aramsızlıq; qırılmazlıq; bütövlük; 2. ardıcıllıq; **to break the ~ of** *smb.'s* **ideas** bir kəsin fikrinin ardıcıllığını qırmaq; *There is no continuity between the parts of his book Onun kitabının hissələri arasında ardıcıllıq yoxdur;* 3. ssenari *(dram əsərinin planı, kino şəklinin məzmunu); I enjoyed the acting but thought the continuity was bad Mən ifaçılıqdan ləzzət aldım, amma mənə elə gəldi ki, ssenari/quruluş pis idi*

**continuous** [kən'tınjuəs] *adj* 1. arasıkəsilməyən, arasıkəsilməz, fasiləsiz, aramsız; uzunsürən, sürəkli, uzunmüddətli; *The brain needs a continuous supply of blood Beynin arasıkəsilməz/fasiləsiz qan təminatına ehtiyacı var;* **~ laughter** aramsız/fasiləsiz gülüş; **~ coughing** aramsız/ fasiləsiz öskürək; **~ show** fasiləsiz/arasıkəsilməz kinofilm nümayiş etdirmə; **~ cropping** *k.t.* növbəsiz əkin; **~ function** *riyaz.* kəsilməz/sonsuz funksiya; **~ fire** *hərb.* sistemli/ardıcıl atəş; **~ service** 1) *hərb.* müddətdən artıq hərbi xidmət; 2) fasiləsiz/arsıkəsilmədən hərəkətdə olma; **~ performance theatre** seanslar arasında fasilə etmədən işləyən kinoteatr; 2. *el.* sabit *(cərəyan haq.);* 3. *qram.* davamedici; **~ forms** davamedici formalar *(fel haq.);* **the present/the past ~ form** indiki / keçmiş zamanın davamedici forması

**continuously** [kən'tınjuəslı] *adv* arasıkəsilmədən, fasiləsiz olaraq, durmadan, aramsız, dalbadal olaraq, daima, həmişə; *That tap was dripping continuously through the night O kran bütün gecəni aramsız olaraq damırdı*

**continuum** [kən'tınjuəm] *n* (*pl* **-nua** *və ya* **ums**) bütövlük; tamlıq; **the ~ of time** zamanın bütövlüyü /tamlığı; *Historians see the past, the pre-*

*sent and the future as forming some kind of continuum Tarixçilər keçmişi, hal-hazırı və gələcəyi bir tam olaraq görürlər / götürürlər*

**contort** [kən'tɔ:t] *v* 1. əymək; **to ~ tree-trunk** ağacın gövdəsini əymək; 2. dəyişdirmək, əyri etmək; *His face was contorted with pain Onun sifəti ağrıdan əyildi;* 3. mənasını dəyişdirmək, təhrif etmək; **to ~ a word out of its ordinary meaning** sözün adi mənasını təhrif etmək/dəyişdirmək

**contorted** [kən'tɔ:tıd] *adj* əyri, əyilmiş; **~ branches** əyilmiş budaqlar; **trees with ~ branches** əyilmiş budaqlı ağaclar; **a face ~ with anger** hirsdən / acıqdan dəyişmiş sifət

**contortion** [kən'tɔ:ʃn] *n* 1. əymə, əyilmə; 2. təhrif etmə / edilmə

**contortionist** [kən'tɔ:ʃnıst] *n* akrobat, yoq *(yoqa məzhəbinə mənsub adam)*

**contour**[1] ['kɔntuər] *n* kontur, ümumi şəkil / təsəvvür; çevrə; **the ~s of the human body/of the continent** insan bədəninin/kontinentin konturu/çevrəsi; **the ~ of the British coast** Britaniya sahillərinin konturu

**contour**[2] ['kɔntuər] *v* konturunu çəkmək; təpənin konturu ilə yol çəkmək; *If we contour this road, it will be longer, but have fewer steep slopes Əgər biz yolu konturla çəksək, o daha uzun olacaq, ancaq sərt enişləri azalacaq*

**contra** ['kɔntrə] *prep lat.* **pro and ~** lehinə və əleyhinə

**contra-** [kɔntrə-] *pref.* 1. *Əks istiqamət/hərəkət/təsir ifadə edən sözlərdə işlədilir:* **contra**distinction zidd, əks, əkslik, ziddiyyət; **contra**rotation əks istiqamətə fırlanma; 2. *Musiqi alətlərinin adında təsadüf edilir:* **contra**bass kontrabas *(iri skripkaya oxşar müsiqi aləti),* **contra**fagotto kontrafaqot *(musiqi aləti)*

**contraband** ['kɔntrəbænd] *adj* qaçaq, kontraband; **~ goods** qaçaq mallar, kontraband / qaçaq mal ticarəti; *He was seized by the police because contraband goods were found in his house Polis onu həbs etdi, çünki onun evindən qaçaq mal tapılmışdı*

**contrabandist** ['kɔntrəbændıst] *n* kontrabandçı, qaçaq mal gətirən

**contrabass** [.kɔntrə'beıs] *n* kontrabas *(musiqi aləti)*

**contra-bassoon** [.kɔntrəbə'su:n] *n* kontrafaqot *(musiqi aləti)*

**contraception** [.kɔntrə'sepʃn] *n* 1. hamiləliyin qarşısını alma, hamilə olmağa imkan verməmə; 2. hamiləliyin qarşısını alan dərman qəbul etmə; *They did not practise contraception because they wanted a baby Onlar hamiləliyə qarşı heç bir dava-dərmandan istifadə etmirdilər, çünki uşaq istəyirdilər*

**contraceptive**[1] [.kɔntrə'septıv] *n tib.* hamiləliyin qarşısını alan vasitə; *Some people think that using contraceptives makes sex less pleasant Bəzi adamlar belə hesab edirlər ki, hamiləlik əleyhinə istifadə edilən vasitələr cinsi əlaqənin ləzzətini azaldır*

**contraceptive**[2] [.kɔntrə'septıv] *adj* hamiləliyin qarşısını alan; *I get regular contraceptive advice from my doctor Mən hamiləliyin qarşısını almaq üçün həmişə həkimimdən məsləhət alıram*

**contract**[1] ['kɔntrækt] *n* I 1. müqavilə, kontrakt, razılaşma; **~ of purchase / of sale** alğı-satqı müqaviləsi/kontraktı; **~ of insurance** sığorta müqaviləsi; **to make/to enter into a ~** müqavilə/kontrakt bağlamaq; **to draw up a ~** müqavilə / kontrakt tərtib etmək; **to accept/to approve a ~** müqavilə qəbul etmək; **to break a ~** müqaviləni / kontraktı pozmaq; **to annul a ~** müqaviləni / kontraktı ləğv etmək; **to be engaged on a ~ to supply *smth.*, to be under ~ for *smth.*** bir şey göndərmək üçün müqavilə/kontrakt imzalamaq; 2. kəbin müqaviləsi; 3. ad etmə, nişanlama, adaxlama; nişan, şirni

**contract** ['kɔntrəkt] *n* II *dilç.* sözün qısa forması, qısaldılmış söz

**contract**[2] ['kɔntrækt] *adj* müqavilə, kontrakt; **~ price** müqavilə /kontrakt qiyməti; **~ value** müqavilə / kontrakt ilə alınan / satılan malların dəyəri; **~ law** müqavilə / kontrakt qanunu

**contract**[3] [kən'trækt] *v* I 1. müqavilə / kontrakt bağlamaq; öz üzərinə təəhhüd götürmək; **to ~ to build a house** ev tikmək üçün müqavilə bağlamaq; **to ~ a marriage with *smb.*** bir kəslə kəbin müqaviləsi bağlamaq; 2. yaratmaq, bağlamaq *(ittifaq və s.);* **to ~ an alliance with a foreign country** xarici ölkə ilə ittifaq yaratmaq; **to ~ friendship with *smb.*** bir kəslə dostluq yaratmaq; 3. əldə etmək; qazanmaq *(vərdiş və s.);* **to ~ good /bad habits** yaxşı / pis vərdiş qazanmaq; 4. tutmaq; **to ~ a disease** xəstələnmək, naxoşlamaq, xəstəlik tutmaq, xəstəliyə tutulmaq

**contract** [kən'trækt] *v* II 1. sıxmaq, qısaltmaq; azaltmaq, əskiltmək; **to ~ expenses** xərcləri azaltmaq/əskiltmək; **to ~ a word** sözü qısaltmaq; 2. sıxılmaq, yığılmaq; *The heart contracts by the action of the muscles Ürək əzələlərin hərəkəti ilə sıxılır;* 3. qaşqabağını yığmaq/tökmək, alnını qırışdırmaq, ağız-burnunu/üz-gözünü büzmək; **to ~ *one's* forehead** alnını qırışdırmaq; **to ~ *one's* eyebrows** qaşqabağını tökmək, sımsırığını sallamaq

**contracted** [kən'træktıd] *adj* I 1. müqavilə ilə müəyyənləşdirilmiş; 2. *arx.* nişanlanmış, adaxlanmış; adaxlı, nişanlı

**contracted** [kən'træktıd] *adj* II 1. qaşqabaqlı, tutqun *(insan sifəti haq.);* büzülmüş, qırışmış, yığılmış; **~ forehead** qırışmış alın; **~ brow** qaşqabaqlı alın; **~ kidney** *tib.* büzüşmüş böyrək; 2. dar, məhdud; **~ mind** kəm ağıl; **~ ideas / views**



məhdud fikir / baxış; 3. *dilç.* qısaldılmış, qısa; **~ form** qısaldılmış / qısa forma; **~ word** qısaldılmış söz

**contractile** [kən'træktaıl] *adj* sıxılıb-açılan, açılıb-yığılan; **~ action** açılıb-yığılan hərəkət; *The heart is a highly contractile organ Ürək yüksək dərəcədə açılıb-yığılan bədən üzvüdür*

**contractility** [.kɔntræk'tılıtı] *n* sıxılma/sıxlaşma qabiliyyəti; yığılma qabiliyyəti/bacarığı

**contracting** [kən'træktıŋ] *adj* razılığa gələn, razılaşan; **~ parties** razılığa gələn partiyalar / tərəflər

**contraction** [kən'trækʃn] *n* 1. ixtisar etmə / edilmə, ixtisara salma; daralma; 2. *dilç.* qısa/qısaldılmış forma; *"Won't" is a contraction of "will not" "Wont" "will not"-un qısa / qısaldılmış formasıdır;* 3. doğuş sancısı; *When you feel the next contraction push very hard and the birth will be very quick Növbəti sancı hiss edəndə bərk güc versən /versəniz, doğuş tez olar*

**contractive** [kən'træktıv] *adj* sıxılıb-açılma, açılıb-yığılma; sıxılma/qısalma qabiliyyəti olan

**contractor** [kən'træktər] *n* podratçı, podrata götürən, podratla iş görən *(adam)*

**contractual** [kən'træktʃuəl] *adj* müqavilə, müqavilədə göstərilmiş, müqavilə təəhhüdü; *You have a contractual duty to provide this shop with 100 coats a week Sən / Siz bu mağazanı həftədə 100 palto ilə təmin etmək haqqında müqaviləyə əsasən üzərinə/üzərinizə təəhhüd götürmüsən / götürmüsünüz*

**contractually** [kən'træktʃuəlı] *adv* müqaviləyə əsasən/görə, müqavilə üzrə/əsasında

**contradict** [.kɔntrə'dıkt] *v* 1. zidd olmaq; *The two reports contradict each other Bu iki məlumat bir-birinə ziddir; The results of the experiment contradicted his theory Təcrübənin nəticələri onun nəzəriyyəsinə zidd oldu;* 2. etiraz etmək, razılaşmamaq, əks getmək; *Don't contradict me Mənə etiraz etmə / etməyin; Why do you always contradict what I say? Nə üçün sən / siz mən nə deyirəmsə, ona etiraz edirsən/edirsiniz?* 3. inkar / təkzib etmək, yalana çıxartmaq; **to ~ a statement / a report** bəyanatı / məlumatı təkzib etmək; **to ~ facts** dəlilləri / faktları inkar etmək

**contradiction** [.kɔntrə'dıkʃn] *n* 1. ziddiyyət, təzad; uyğun gəlməmə, müvafiq olmama, düz gəlməmə; 2. təkzib, təkzib etmə; **an official ~ of the rumours** şayiələrin rəsmi təkzib edilməsi

**contradictious** [.kɔntrə'dıkʃəs] *adj* 1. mübahisə etməyi sevən; uyğun gəlməyən, zidd olan; 2. inkar edən, təkzib edən

**contradictive** [.kɔntrə'dıktıv] *adj* zidd, bir-birinə zidd, bir-birinə uymayan, bir-birilə düz gəlməyən

**contradictory** [.kɔntrə'dıktərı] *adj* 1. ziddiyyətli; **~ assertions /news / directions / statements** ziddiyyətli müddəalar/ xəbərlər / göstərişlər / bəyanatlar; *Tom has a nasty contradictory nature Tomun iyrənc ziddiyyətli təbiəti var;* 2. zidd olan, uyğun gəlməyən, bir yerə sığmayan; **schemes ~ to common sense** sağlam düşüncə ilə bir yerə sığmayan planlar

**contradistinct** [.kɔntrədıs'tıŋkt] *adj* zidd, əks, əks / zidd keyfiyyəti ilə fərqlənən

**contradistinction** [.kɔntrədıs'tıŋkʃn] *n* müqayisə etmə, tutuşdurma, qarşı qoyma; **plants in ~ to animals** bitkilər heyvanlarla müqayisədə

**contradistinguish** [.kɔntrədıs'tıŋgwıʃ] *v* müqayisə etmək, tutuşdurmaq; qarşı qoymaq

**contrahent**[1] ['kɔntrəhənt] *n* razılığa gələn tərəflər

**contrahent**[2] ['kɔntrəhənt] *adj* razılığa gələn, razılaşan

**contranatural** ['kɔntrə'nætʃrəl] *adj* qeyri-təbii, qeyri-normal, təbiətə zidd olan

**contrapose** ['kɔntrə'pouz] *v* müqayisə etmək, tutuşdurmaq; qarşı qoymaq

**contraposition** [.kɔntrəpə'zıʃn] *n* müqayisə etmə, tutuşdurma, qarşı-qarşıya qoyma; antiteza *(əkslik, zidlik);* **in ~ to/with** ziddinə olaraq

**contrariety** [.kɔntrə'raıətı] *n* ziddiyyət, zidlik; təzad; bir araya sığmazlıq, bir araya sığa bilməmə; *How can these contrarieties agree? Bu ziddiyyətlər necə barışa bilər?* **~ to sound reason** sağlam düşüncəyə zidd

**contrarily** ['kɔntrərılı] *adv d.d.* 1. əksinə, ziddinə, ziddinə olaraq, **to testify ~** əksinə / ziddinə şəhadət / ifadə vermək; 2. əksinə, tərsinə, əks istiqamətə

**contrariness** [kən'trərınıs] *n* inad, inadcıllıq, inadkarlıq, tərslik, öz bildiyini etmə

**contrarious** [kən'trəriəs] *adj* 1. *arx.* inad, inadcıl, inadkar, kəc, tərs; 2. zərərli, ziyanlı, xətərli; əlverişsiz, yaramayan

**contrariwise** ['kɔntrərıwaız] *adv* 1. tərsinə, əksinə; 2. digər tərəfdən; *I am happy when the sun shines, and contrariwise, I am unhappy when it rains Günəş parlayanda mənim kefim saz olur və əksinə, yağış yağanda kefim korlanır/pozlur*

**contrarotation** [.kɔntrərou'teıʃn] *n* əks istiqamətə fırlanma

**contrary**[1] ['kɔntrərı] *n*: **on the ~** əksinə; *-I believe you like your job -On the contrary, I hate it Mən inanıram ki, sənin/sizin işindən/işinizdən xoşun gəlir/xoşunuz gəlir -Əksinə, mənim ondan zəhləm gedir;* **to the ~** əks halda/təqdirdə; *I will come on Sunday unless you write me to the contrary Mən bazar günü gələcəyəm, əgər sən / siz yazmasan / yazmasanız ki, gəlməyim*

**contrary**[2] ['kɔntrərı] *adj* 1. zidd, əks; **~ news /directions/measures** əks xəbərlər / göstərişlər/ tədbirlər; *They hold contrary opinions Onların rəyi/fikri bir-birinə ziddir;* 2. əks istiqamətli, qarşı; **~ wind** qarşı külək; **to look the ~ way** əks tərəfə baxmaq; 3. arzu edilməyən, əlverişsiz *(hava haq.)*

**contrary**[3] ['kɔntrərı] *v dial.* etiraz etmək, əksinə çıxmaq, ziddinə / əksinə olmaq

**contrary to** ['kɔntrərıtu:] *prep* əksinə, baxmayaraq, ziddinə, zidd olaraq; **to act ~ the rules** qaydaya zidd hərəkət etmək; qaydanın əksinə/ziddinə hərəkət etmək; *He acted contrary to my wishes O mənim arzularımın əleyhinə/əksinə hərəkət etdi; Contrary to my expectations, all went well Mənim gözlədiyimin ziddinə olaraq hər şey yaxşı getdi / oldu;* **to act ~ nature** təbiətə zidd hərəkət etmək

**contrarily** ['kɔntrərılı] *adv* əksinə, ziddinə, əksinə/ziddinə olaraq; **to speak ~** əksinə / ziddinə danışmaq

**contrariness** ['kɔntrərınıs] *n* əkslik, ziddinə / əksinə olma

**contrast**[1] ['kɔntræst] *n* **1.** kontrast, təzad, ziddiyyət, fərq; *There is a striking contrast between the two friends İki dost arasında ciddi fərq var; His white hair was in sharp contrast to his dark skin Onun ağ saçı qara dərisi ilə kəskin təzad / kontrast təşkil edirdi; The work you did today is quite a contrast you did last week Sənin/Sizin bu gün gördüyün/gördüyünüz iş keçən həftə gördüyünə/gördüyünüzə ziddir;* **2.** müqayisə etmə, tutuşdurma; **in ~ with** müqayisədə; *In contrast with your brother you are more careful Qardaşınla müqayisədə sən/siz daha diqqətlisən/diqqətlisiniz*

**contrast**[2] [kən'træst] *v* **(with) 1.** müqayisə etmək, tutuşdurmaq, qarşılaşdırmaq, qarşı-qarşıya qoymaq; **to ~ two books** iki kitabı müqayisə etmək/tutuşdurmaq; *It is interesting to contrast the two writers Bu iki yazıçını müqayisə etmək/tutuşdurmaq maraqlıdır; In this book the writer contrasts good with/and evil Bu kitabda yazıçı xeyirlə şəri müqayisə edir/tutuşdurur / qarşı-qarşıya qoyur;* **2.** zidd / əks olmaq, təzad / ziddiyyət təşkil etmək; *The two brothers contrasted sharply both in appearance and in character Bu iki qardaş istər xarici görkəm, istərsə də xasiyyətcə birbirilə ziddiyyət / təzad təşkil edir*

**contravene** [,kɔntrə'vi:n] *v* **1.** pozmaq, riayət/əməl etməmək; **to ~ a custom/regulation** adəti/qaydanı pozmaq, adətə/qaydaya əməl etməmək; **to ~ a law** qanunu pozmaq, qanuna riayət / əməl etməmək; *Your behaviour contravenes established social customs Sənin / Sizin davranışın / davranışınız mövcud ictimai adətləri/ənənələri pozur;* **2.** mübahisə/etiraz etmək; qəbul etməmək; **to ~ a statement** bəyanata etiraz etmək; **3.** zidd /əks olmaq *(dəlilə və s.)*

**contravention** [,kɔntrə'venʃn] *n* pozma *(qanunu, müqavilələni və s.); To steal is a contravention of the law Oğurluq etmək qanun pozuntusudur*

**contretemps** ['kɔ:ŋtrəta:ŋ] *n fr.* pis hadisə/xəbər, acı xəbər; gözlənilməz maneə/çətinlik, narazılıq; *There was a minor contretemps with one of the passengers Sərnişinlərdən birinə balaca bir hadisə üz verdi*

**contribute** [kən'trıbju:t] *v* ianə vermək/etmək, kömək etmək; bağışlamaq; **to ~ to the Red Cross** Qırmızı Xaç cəmiyyəti fonduna ianə vermək; **to ~ food and clothing for the relief of the refugees** qaçqınlara kömək olaraq ərzaq və paltarla yardım etmək; **2.** töhfə vermək *(elmə və s.),* imkan yaratmaq, kömək etmək, səbəb olmaq; **to ~ suggestions on scientific questions** elmi məsələlər üzrə təklif vermək; *He contributed greatly to the improvement of national music / literature etc. O, milli musiqinin/ədəbiyyatın və s. təkmilləşməsinə böyük kömək etmişdir; Drink contributed to his downfall Onun düşkünlüyünə səbəb əyyaşlıq oldu;* **3.** əməkdaşlıq etmək *(qəzetdə, jurnalda)*

**contribution** [,kɔntrı'bju:ʃn] *n* **1.** ianə vermə; bağışlama; *I give a small contribution to the church each week Mən hər həftə kilsəyə bir az ianə verirəm;* **2.** töhfə, hədiyyə; **~ to the cause of peace** sülh işinə töhfə /hədiyyə; *The successful launchings of the space ships constitute a tremendous contribution to the world science Kosmik gəmilərin müvəffəqiyyətlə buraxılması (orbitə çıxarılması) dünya elminə çox böyük töhfədir;* **to make a ~ to smth.** bir şeyə töhfə / hədiyyə vermək; **3.** əməkdaşlıq *(qəzetdə, jurnalda);* **4.** qəzetə /jurnala verilən məqalə; **5.** kömək, yardım; **6.** kontribusiya, təzminat *(müharibə zamanı düşmənin işğal etdiyi yerlərdəki əhalidən zorla yığılan pul, ərzaq və s.);* **to lay under ~** vergi qoymaq; **to lay ~ on tobacco** tütünə vergi qoymaq

**contributor** [kən'trıbjutə[r]] *n* **1.** ianəçi, ianə verən; **2.** əməkdaş *(qəzetdə, jurnalda)*

**contributory** [kən'trıbjutərı] *adj* **1.** ianəçi, ianə verən; **~ pension plan** fəhlələrin əməkhaqqından tutulan və sahibkarların ianəsi hesabına təqaüd vermə sistemi; **2.** əməkdaşlıq edən; **3.** kömək edən, imkan yaradan; **a ~ factor** kömək edən / imkan yaradan amil; *Your stupidity was a contributory cause of the fire Yanğına sənin / sizin axmaqlığın/axmaqlığınız səbəb olub*

**contrite** ['kɔntraıt] *adj şair.* peşman olan, peşmançılıq çəkən; tövbə edən; **to look ~** peşman görünmək, peşmançılıq çəkmək; **a ~ apology** peşmançılıqdan əfv istəmə; *Jane looked contrite, even distressed Ceyn peşimançılıq çəkirdi, hətta dərdli görünürdü*

**contrition** [kən'trıʃn] *n* peşmançılıq; **tears of ~** peşmançılıqdan axıdılan göz yaşları

**contrivance** [kən'traıvəns] *n* **1.** icad; fikir, niyyət *(xüs. satqınlıq haq.);* **2.** ixtiraçılıq, ixtira etmə qabiliyyəti, ixtiraçılıq qabiliyyəti; **3.** *tex.* ixtira / icad etmə; **4.** cihaz *The scientists invented a new contrivance for milking cows Alimlər inəkləri sağmaq üçün yeni cihaz ixtira etdilər; Such a machine is beyond the contrivance of ordinary people Belə maşınları adi adamlar ixtira edə bilməzlər*



**contrive** [kən'traıv] *v* **1.** kəşf / icad etmək; fikirləşib tapmaq; **to ~ a new type of machine/ radio /airship, etc.** yeni növ maşın /radio/hava gəmisi və s. kəşf /icad etmək; **to ~ a means of escape** qaçmaq üçün fikirləşib vasitə tapmaq; *The prisoners contrived a way of escaping / to escape Dustaqlar / Məhbuslar qaçmaq üçün yol fikirləşib tapdılar;* **2.** hər cür çətinliyə baxmayaraq bir işin öz istəyinə uyğun olaraq baş verməsini təmin etmək; *Can you contrive to be here early? Sən / Siz çalışıb burada erkən ola bilərsənmi/bilərsinizmi? After much difficulty I contrived to escape Böyük çətinlikdən sonra mən qaçmağa nail oldum*

**contrived** [kən'traıvd] *adj* uydurulmuş; **a novel with a ~ plot** uydurulmuş süjetli roman

**contriver** [kən'traıvə[r]] *n* uydurmaçı, qondarmaçı, yalançı, böhtançı

**control**[1] [kən'troul] *n* **1.** idarə, nəzarət, idarə / nəzarət etmə; *The teacher had good control over his class Müəllim sinfə yaxşı nəzarət edirdi;* **under government ~** hökumətin nəzarəti altında; **circumstances beyond our ~** bizdən asılı olmayan vəziyyət; **to get beyond / out of ~** təsir dairəsindən çıxmaq; **to bring under ~** nəzarət altına almaq, nəzarətə götürmək, nəzarət etmək; **social ~** ictimai nəzarət; **selective ~** seçmə nəzarət; **disarmament ~** tərk-silah üzərində nəzarət; **to exercise ~ over smb. / smth.** bir kəsə / bir şeyə nəzarət etmək; **to have ~ over smth.** bir şeyi öz nəzarəti altında saxlamaq, bir şeyi nəzarətə götürmək; **to be under ~** nəzarət altında olmaq, nəzarətə götürülmək; *He has control of the store Anbar onun ixtiyarındadır;* **2.** təmkinlilik, səbirlilik, özünü /nəfsini saxlaya bilmə, təmkin, səbir, hövsələ; *Don't lose control of your temper Səbirli ol/olun, Hövsələni/Hövsələnizi bas/basın;* **to write/to read without ~** sıxılmadan yazmaq/danışmaq; **to keep one's feeling under ~** hissini cilovlamaq, özünü ələ almaq; **to regain ~ of oneself** özünü ələ almaq; **3.** tənzimləmə, idarə etmə; nizamlama; **rent ~** ev kirayəsini / arenda haqqını tənzim etmə; **traffic ~** küçə hərəkətini nizamlama; **birth ~** doğumu nizamlama; **remote ~** uzaqdan / uzaq məsafədən idarə etmə; **remote ~ from the earth** yerdən uçuşu avtomatik idarə etmə; **to lose ~ of a motor-car** avtomaşına nəzarəti itirmək; **to go out of ~** *av. dən.* idarəni itirmək; **4.** *rad.* nizamlama

**control**[2] [kən'troul] *adj* yoxlama, kontrol, idarə; **~ experiment** kontrol sınaq; **~ organization/commission** yoxlama təşkilatı / komissiyası; **~ flight** *av.* idarə olunan uçuş; **~ tower** *av.* dispetçer qülləsi

**control**[3] [kən'troul] *v* **(-ll-) 1.** rəhbərlik / idarə etmək; **a dictator who ~led the country for 30 years** ölkəni 30 il idarə edən diktator; **a car which is hard to ~ at high speed** yüksək sürətlə gedərkən çətin idarə olunan maşın; *He knows how to control his horse O, atını necə idarə etməyi bilir;* **2.** özünü ələ almaq/saxlamaq; *I was so furious I couldn't control myself Mən elə qeyzli idim ki, özümü ələ ala bilmədim;* **3.** tənzimləmək, nizamlamaq; nizama salmaq; **to ~ traffic** küçə hərəkətini nizamlamaq/tənzimləmək; **to ~ prices** qiymətləri tənzimləmək; **4.** *id.* kontrol zərbə endirmək *(qılınc oynatmada)*

**control-gear** [kən'troulgıə[r]] *n tex.* idarəetmə mexanizmi

**controllability** [kən,troulə'bılıtı] *n tex.* manevr qabiliyyəti, idarə oluna bilmə

**controllable** [kən'trouləbl] *adj* **1.** idarə olunan, idarə oluna bilən, tənzim oluna bilən; **2.** nəzarət oluna bilən; **3.** cilovlana bilən, qarşısıalına bilən

**controlled** [kən'trould] *adj* idarə olunan, idarə oluna bilən, tənzim edilən, nizamlaşdırılan; **~ disarmament** idarə edilə / oluna bilən tərk-silah; **~ nuclear reaction** *fiz.* nəzarət edilə / oluna bilən nüvə reaksiyası; **~ mine** *hərb. dən.* idarə olunan mina; **~ pollination** *bot.* süni tozlama

**controller** [kən'troulə[r]] *n* **1.** kontrolçu *(yoxlayıcı, nəzarətçi);* müfəttiş; təlimatçı; **2.** *tex.* avtomatik nizamlayıcı; **3.** operator

**controversial** [,kɔntrə'və:ʃl] *adj* **1.** mübahisəli; mübahisə doğuran; **~ question** mübahisəli məsələ; **~ book** mübahisə doğuran kitab; **~ decision** mübahisəli qərar; **2.** mübahisə etməyi sevən; **~ person** mübahisə etməyi sevən adam

**controversially** [,kɔntrə'və:ʃəlı] *adv* mübahisəli tərzdə, mübahisə etməklə

**controversy** ['kɔntrəvə:sı] *n* **1.** mübahisə, bəhs, polemika; çəkişmə, münaqişə; **border ~** sərhəd münaqişəsi; **beyond/without ~** şübhəsiz, mübahisəsiz, şəksiz, yəqin; *The new government appointments caused much controversy Yeni hökumətin təşkili xeyli mübahisə doğurdu;* **2.** *hüq.* hüquqi münaqişə, mülki məhkəmə işi

**controvert** ['kɔntrəvə:t] *v* **1.** mübahisə / bəhs etmək, höcətləşmək, sözə gəlmək, çəkişmək; **2.** təkzib etmək; **a fact that cannot be ~ed** təkzibedilməz fakt

**contumacious** [,kɔntju:'meıʃəs] *adj* **1.** tərs, inad, inadcıl, inadkar, kəc, itaət etməyən, itaətsiz, ipəyatmayan; **2.** *hüq.* çağırışa riayət etməyərək məhkəməyə gəlməyən, məhkəmənin hökmünə tabe olmayan

**contumacy** ['kɔntjuməsı] *n* **1.** tərslik, inad, inadkarlıq, kəclik; itaətsizlik, itaət etməmə, sözə baxmama; **2.** *hüq.* məhkəməyə gəlməmə, məhkəmənin hökmünə tabe olmama

**contumelious** [,kɔntju:'mı:ljəs] *adj* təhqiredici, həqarətli, alçaldıcı, toxunan; ədəbsiz, qaba, kobud, sözqaytaran; **~ taunt** həqarətli / təhqiredici rişxənd

**contumely** ['kɔntju:mlı] *n* 1. təhqir, həqarət, təhqir etmə *(əsas söz və ya hərəkətlə)*; 2. ədəbsizlik, qabalıq, kobudluq, hörmətsizlik; 3. biabırçılıq, rüsvayçılıq
**contuse** [kən'tju:z] *v* kontuziya etmək, kontuziyalamaq; əzmək, zədələmək
**contusion** [kən'tju:ʒn] *n* kontuziya; əzmə, zədələmə, əzik, zədə
**conundrum** [kə'nʌndrəm] *n* tapmaca, bağlama; **to speak in ~s** eyhamla / üstüörtülü danışmaq
**conurbation** [.kɔnə:'beıʃn] *n* böyük şəhər *(şəhərətrafı ilə birlikdə)*; **the Baku ~** böyük Bakı
**convalesce** [.kɔnvə'les] *v* sağalmaq, yaxşı olmaq, yaxşılaşmaq
**convalescence** [.kɔnvə'lesns] *n* sağalma, yaxşılaşma, yaxşı olma
**convalescent**[1] [.kɔnvə'lesnt] *n* sağalan, yaxşılaşan *(adam)*
**convalescent**[2] [.kɔnvə'lesnt] *adj* yaxşılaşan, sağalan; **~ care** xəstəlikdən durmuş adama göstərilən qayğı; **~ home** sanatoriya, istirahət evi / ocağı; **~ diet** yüngül pəhriz
**convection** [kən'vekʃn] *n* konveksiya *(hərəkət edən mühitin, məs., havanın, buxarın və ya mayelərin hərarəti özləri ilə aparması)*
**convector** [kən'vektəʳ] *n* konvektor *(isti hava ilə işləyən qızdırıcı cihaz)*
**convene** [kən'vi:n] *v* 1. çağırmaq; təşkil etmək, toplamaq, yığmaq; **to ~ a meeting /a council /an assembly** iclas /şura / yığıncaq çağırmaq; 2. məhkəməyə çağırmaq
**convener** [kən'vi:nəʳ] *n iclasın çağırılma gününü təyin edən və onu hazırlayan təşkilat / cəmiyyət üzvü*
**convenience** [kən'vi:njəns] *n* 1. rahatlıq, münasiblik, uyğunluq; **for ~'s sake** rahatlıq üçün / naminə; *At your convenience Xatirin / Xatiriniz necə istəyirsə; Please reply at your earliest convenience Zəhmət olmasa, mümkün qədər tez cavab verin;* **to suit / to await smb.'s ~** bir kəsin rahatlığını nəzərə almaq; *We hope that this will suit your convenience Biz ümid edirik ki, bu sənin/sizin üçün rahat olacaq;* **for the ~ of our customers** müştərilərimizin rahatlığı üçün / naminə; 2. rahatlıq, komfort; **a house full of ~s of every sort** hər cür rahatlığı olan ev; 3. *evf.* ayaqyolu; 4. üstünlük; gəlir, fayda; **to make a ~ of smb.** bir kəsin rəhmdilliyindən / mərhəmətindən həyasızcasına istifadə etmək;
◊ **marriage of ~** məqsədli evlənmə
**convenient** [kən'vi:njənt] *adj* rahat, münasib; **~ time / place** münasib vaxt / yer; **~ tool** münasib/rahat alət; **~ method** münasib metod/üsul; *I'll call on you tomorrow evening if it's convenient for you Sənə / Sizə rahatdırsa, mən sizə sabah axşam gələcəm; Our house is very convenient for the shops Mağazalara getmək baxımından bizim ev çox rahatdır*
**conveniently** [kən'vi:njəntlı] *adv* rahat, qolay, rahatca
**convent** ['kɔnvənt] *n* monastır *(rahiblər yaşayan)*
**convention** [kən'venʃn] *n* 1. iclas, qurultay; **teachers' ~** müəllimlərin qurultayı; **the recent ~ of the party** partiyanın bu günlərdəki/yaxınlardakı qurultayı; **to hold a ~** iclas/qurultay çağırmaq; 2. müqavilə, saziş; konvensiya *(beynəlxalq saziş/müqavilə)*; **international ~** beynəlxalq konvensiya/saziş; **multilateral ~** çoxtərəfli konvensiya/saziş; **diplomatic ~** diplomatik saziş; **the Geneva Convention** Cenevrə Konvensiyası
**conventional** [kən'venʃənl] *adj* 1. ədəbli, tərbiyəli, nəzakətli; əlverişli; olduqca yaxşı; kübar; **~ manners** ədəbli/kübar davranışlar; **~ clothes** ədəbli/ləyaqətli geyim; *She is very conventional in her clothes O, çox ədəbli paltar geyir;* 2. *hərb.* adi, adəti, adət olunmuş/edilmiş, ənənəvi; **~ weapon** adi silah; **~ armed forces** adi silahlı qüvvələr; **a ~ power station** adi elektrik stansiyası *(yəni atomla işləməyən)*; 3. razılaşdırılmış, qərarlaşdırılmış, şərtləşdirilmiş; **~ rate** *tic.* şərtləşdirilmiş məzənnə; 4. normal; **~ yield** *k.t.* normal məhsul; 5. şərti; **~ sign** şərti işarə
**conventionalizm** [kən'venʃnəlızm] *n* 1. şərtilik; köhnəlikdən əl çəkməmə/götürməmə; şablonluq, trafaretlik; adilik; ənənəvilik *(həm də incəsəntdə)*; 2. *fəls.* konvensionalizm
**conventionalist** [kən'venʃnəlıst] *n* şərtilik / ənənəvilik tərəfdarı; formalist
**conventionality** [kən.venʃə'nælıtı] *n* şərtilik, məşrutluq; ənənəvilik; *The conventionality of his clothes makes him look old fashioned Paltarının ənənəviliyi onun köhnəlik tərəfdarı olduğuna dəlalət edir*
**conventionally** [kən'venʃnəlı] *adv* ədəblə, nəzakətlə, ləyaqətlə; **to dress ~** ləyaqətlə geymək; **to behave ~** ədəblə/ləyaqətlə davranmaq
**converge** [kən'və:dʒ] *v* 1. bir nöqtədə birləşmək; birləşmək *(xətt, yol və s. haq.)*; *Railway lines seem to converge when one looks at them from a distance Uzaqdan baxanda adama elə gəlir ki, dəmir yol xətləri bir nöqtədə birləşir; The two armies converged in the enemy capital for the last battle Bu iki ordu son döyüş üçün düşmən paytaxtında birləşdi;* 2. *riyaz.* yönəlmək *(hüduda doğru)*
**convergence** [kən'və:dʒəns] *n* 1. görüşmə; 2. *fiz.* konvergensiya
**convergency** [kən'və:dʒənsı] *n* = **convergence**
**convergent** [kən'və:dʒənt] *adj* 1. *riyaz.* görüşən, bir nöqtədə kəsişən; 2. *fiz.* konvergent *(konvergensiya nəticəsində yaxınlaşan)*
**conversable** [kən'və:sbl] *adj* 1. danışqan, söhbətcil, çoxdanışan; 2. ünsiyyətli, adamayovuşan, mehriban; 3. söhbətə yarayan *(mövzu haq.)*
**conversant** [kən'və:sənt] *adj* məlumatlı, məlu-



matı olan, xəbərdar olan; tanış *(bir şeylə)*; təcrübəli, bilikli, səriştəli; **~ with a subject/a person** mövzu ilə/ adamla tanış olan; *You need to be fully conversant with the rule of the game Sən /Siz oyunun qaydaları ilə ətraflı tanış olmalısan/olmalısınız; I can't claim conversant with any of the sciences because I've never studied them Mən bu elmlərin heç biri üzrə səriştəli olduğumu iddia edə bilmərəm, çünki mən onlarla heç vaxt məşğul olmamışam*
**conversation** [.kɔnvə'seıʃn] *n* 1. danışıq, söhbət; **to have/to hold a ~ with *smb.*** bir kəslə danışıq aparmaq/ söhbət etmək; **to enter/to get into ~** danışığa qoşulmaq; **to resume a ~** danışığa yenidən başlamaq; **to give a ~ another turn** söhbəti/danışığı başqa mövzuya keçirmək; **to keep up a ~** söhbəti davam etdirmək, söhbətin davam etməsinə şərait yaratmaq; *It's time we had a serious conversation about your career Sənin/Sizin karyeran/karyeranız haqqında ciddi danışmaq vaxtıdır;* 2. qeyri-rəsmi danışıqlar
**conversational** [.kɔnvə'seıʃnəl] *adj* 1. danışıq; **~ style** danışıq üslubu; *Business letters are not usually written in conversational style Biznes məktubları adətən danışıq üslubunda yazılmır;* **~ French/Azerbaijani/Russian /English, *etc.*** fransız/ Azərbaycan /rus /ingilis və s. danışıq dili; 2. danışqan, çoxdanışan, danışmağı sevən
**conversationalist** [.kɔnvə'seıʃnəlıst] *n* danışqan, söhbətcil, söhbət etməyi sevən adam; maraqlı müsahib / həmsöhbət
**converse**[1] ['kɔnvə:s] *n arx.* I 1. söhbət, danışıq; 2. ünsiyyət; əlaqə
**converse** ['kɔnvə:s] *n* II əks, əksi olma; ***Empty** is the converse of **full** **Empty** (boş) **full** (dolu)-nun əksidir; He thinks he's attractive to women, though in fact the converse is the case O, fikirləşir ki, o, qadınların xoşuna gəlir, əslində isə məsələ əksinədir*
**converse**[2] ['kɔnvə:s] *adj* əksinə, əks; **~ opinion** zidd/əks fikir; *I hold the converse opinion Mən əks fikirdəyəm*
**converse**[3] [kən'və:s] *v* 1. danışmaq, söhbət etmək; *After a year studying at the university, I felt able to converse with anyone about anything Mən bir il universitetdə oxuduqdan sonra hiss etdim ki, hər kəslə istənilən şey haqqında danışa bilərəm;* 2. ünsiyyət saxlamaq
**conversely** ['kɔnvə:slı] *adv* əksinə, ziddinə; *You can add water to flour or conversely flour to water Sən/Siz ya suyu una, və ya əksinə, unu suya qata bilərsən /bilərsiniz*
**conversion** [kən'və:ʃn] *n* 1. **(to, into)** çevrilmə, dönmə; **the ~ of cream into butter** qaymağın/xamanın yağa çevrilməsi; 2. başqa dinə keçmə/dini qəbul etmə; **~ to Christianity** xristianlığa keçmə, xristianlığı qəbul etmə; *There were many conversions to Christianity among the ancient Romans Qədim Romalıların arasında xristianlığı qəbul edənlər çox olmuşdur;* 3. əqidənin/inamın dəyişməsi, bir partiyadan başqasına/digərinə keçmə; 4. dəyişmə; **the ~ of teachers to new methods of teaching** təlimdə müəllimlərin yeni metoda keçməsi/metodu dəyişməsi; *Do you know a firm that can do house conversion? Sən / Siz elə bir firma tanıyırsanmı/tanıyırsınızmı evin formasını dəyişsin?* 5. *mal.* konversiya, dəyişmə *(bir pul vahidini digərinə)*; **~ of pounds into dollars** funtun dollara çevrilməsi/ dəyişməsi; 6. *dilç.* konversiya *(sözün morfoloji formasını dəyişmədən müxtəlif nitq hissəsi kimi işlənməsi)*
**convert** ['kɔnvə:t] *v* 1. çevirmək; **to ~ swamps into park** bataqlığı parka çevirmək; **to ~ water into steam** suyu buxara çevirmək; 2. keçmək, qəbul etmək *(başqa dini və s.)*; 3. *hüq.* etibar edilmiş əmlakı öz adına çevirmək / keçirmək
**converter** [kən'və:təʳ] *n* 1. *tex.* konvertor *(poladəritmə işində işlənən aparat)*; 2. *fiz.* dəyişdirici *(elektrik cərəyanını bir növdən başqa növə çevirən aparat)*; 3. *amer. hərb.* şifrləmə maşını
**convertibility** [kən.və:tə'bılıtı] *n* 1. dönmə, qayıtma, dönmə qabiliyyəti; 2. *mal.* valyutanın sərbəst dəyişə bilməsi; **~ of the pound** funt sterlinqin dəyişmə qabiliyyəti
**convertible**[1] [kən'və:təbl] *n* üstü açılan avtomobil
**convertible**[2] [kən'və:təbl] *adj* 1. dəyişdirilə bilən, çevrilə bilən, çevrilmə qabiliyyətinə malik olan; **~ currencies** çevrilə bilən valyutalar; *The dollar is convertible the rouble is not Dollar çevrilə biləndir, rubl yox;* 2. qatlanan, açılan, örtülüb açılan; **a ~ bed** qatlanan / örtülüb açılan çarpayı; **a sofa that is ~ into a bed** açılıb çarpayıya çevrilən divan; *This sofa is convertible Bu divan açılandır;* 3. qatlanan, qaldırılan, açılan; **~ body** kuzovu yuxarı qalxan *(avtomaşın haq.)*
**convex** ['kɔn'veks] *adj* qabarıq; qabağa çıxmış; dombalan; **a ~ mirror** qabarıq güzgü; **a ~ lens** qabarıq linza
**convexity** [kən'veksıtı] *n* qabarıqlıq; qabarıq yer, çıxıntı
**convey** [kən'veı] *v* 1. aparmaq *(miniklə)*, daşımaq; gətirmək *(miniklə)*; **to ~ goods/ luggage /passengers** mal/yük/sərnişin daşımaq; 2. keçirmək *(xüs. iyi, səsi və s.)*; **to ~ electricity** elektrik keçirmək; *Air conveys sound Hava səsi keçirir; Wires convey electricity Məftil elektriki keçirir;* 3. yetirmək, çatdırmaq, göndərmək; **to ~ greetings / information** salam/məlumat göndərmək; 4. ifadə etmək; *Words fail to convey my feelings Mənim hisslərimi ifadə etməkdə sözlər acizdir;* **to ~ the meaning** məna ifadə etmək/bildirmək; *It conveys nothing to my mind Bu mənə heç nə demir;* 5. *hüq.* əmlak/hüquq vermək
**conveyance** [kən'veıəns] *n* 1. daşıma, daşınma,

göndərmə, göndərilmə; **air** ~ hava yolu ilə daşıma; **the ~ of goods by rail** malların/yükün dəmir yolu ilə daşınması; 2. daşıma vasitəsi; nəqliyyat vasitəsi; **old-fashioned ~s** köhnə dəbli nəqliyyat vasitələri; **a public** ~ ictimai nəqliyyat; 3. göndərmə, yetirmə, ötürmə *(məlumat və s. haq.)*; 4. *hüq.* əmlak vermə *(xüs. daşınmayan əmlakı)*, hüquq vermə

**conveyancer** [kən'veıənsə^r] *n* daşınmaz əmlakın verilməsi ilə məşğul olan hüquqşünas

**conveyer** [kən'veıə^r] *n tex.* konveyer

**conveyor** [kən'veıə^r] *n* = **conveyer**

**convict**[1] ['kɔnvıkt] *n* məhkum, dustaq; cani, katorqa çəkmiş adam; **returned** ~ həbsxanadan buraxılan/azad edilən adam

**convict**[2] ['kɔnvıkt] *adj* 1. katorqa; ~ **prison** katorqa həbsxanası; ~ **ship** cinayətkarları aparan gəmi; 2. məhkum / həbs edilmiş

**convict**[3] [kən'vıkt] *v* 1. *hüq.* günahkar hesab etmək, hökm çıxarmaq; 2. günahını boynuna almağı başa salmaq, öz günahını boynuna almağa məcbur etmək; 3. *arx.* inandırmaq; sübut etmək; *No use talking, you can't convict me Danışığın mənası yoxdur, sən /siz məni inandıra bilməzsən / bilməzsiniz*

**conviction** [kən'vıkʃn] *n* 1. *hüq.* ittiham etmə, hökm, ittihamnamə; müttəhimi günahkar hesab etmə; 2. inam, əqidə, məslək, etiqad; *It is my strong conviction that... Mənim möhkəm əqidəm / inamım belədir ki,...; He is an internationalist by conviction O, inamına / əqidəsinə görə beynəlmiləlçidir;* **with** ~ inamla; *The actors played with conviction Aktyorlar inamla oynadılar;* **to carry** ~ inamlı olmaq/səslənmək; *His story does not carry much conviction Onun danışıqları çox da inandırıcı deyil;* **religious ~s** dini inam / etiqad; 3. qətilik, əzm, möhkəmlik; əminlik, əmin olma; **the ~ that the next morning he would receive a letter** onun ertəsi gün məktub alacağına əminlik

**convictive** [kən'vıktıv] *adj* inandırıcı, əsaslı; ~ **answer** inandırıcı / əsaslı cavab

**convince** [kən'vıns] *v* inandırmaq, əmin etmək; **to be ~d** inanmaq, əmin olmaq; **to ~ *smb.* of *one's* sincerity** bir kəsi öz səmimiyyətinə inandırmaq; *We convinced Ann to go by train rather by plain Biz Annanı inandırdıq ki, təyyarə ilə getməkdənsə qatarla getsin;* **to ~ *smb.* that he is mistaken** bir kəsi səhv etdiyinə inandırmaq; *He has convinced himself that his method is the best O inanır ki / əmindir ki, onun metodu ən yaxşı metoddur*

**convinced** [kən'vınst] *adj* inanan, inanmış, əqidəli, etiqadlı, inamlı, əzmli; **to be ~ of *smth.*** bir şeyə əmin olmaq; *I am convinced of her innocence Mən onun günahsız olduğuna əminəm / inanıram*

**convincing** [kən'vınsıŋ] *adj* inandırıcı, qaneedici, sübutlu, əsaslı, qəti, qətiyyətli; **a ~ speech** əsaslı nitq; **a ~ argument** inandırıcı/əsaslı dəlil; **a ~ victory** qəti qələbə; **a ~ supporter of his political party** siyasi partiyasının qətiyyətli tərəfdarı /tərəfkeşi; *Their claim to have developed atomic weapons is not convincing Onların atom silahlarını inkişaf etdirmək haqqındakı iddiası inandırıcı deyil; Your arguments are not convincing Sənin / Sizin dəlilin / dəliliniz inandırıcı / əsaslı deyil*

**convincingly** [kən'vınsıŋlı] *adj* inandırıcı, inandırıcı surətdə, əsaslı surətdə / tərzdə, inadla, artıq dərəcədə; *Her proposal was convincingly argued Onun təklifi əsaslı surətdə müzakirə doğurdu*

**convive** ['kɔnvaıv] *n* həmpiyalə, içki / kef yoldaşı

**convivial** [kən'vıvıəl] *adj* 1. şən, şad, kefcil, yeyib-içən, yeyib-içməyi sevən; bir yerdə yeyib-içməyə həvəs göstərən; ~ **companions** kefcil / yeyib-içməyi sevən dəstə/kampaniya; 2. *(hadisə və ya vəziyyət haqqında)* xoş, xoşagələn, şən; qonaqlıq, ziyafət; ~ **surroundings** şən / xoş mühit; ~ **evening** ziyafət gecəsi

**conviviality** [kən.vıvı'ælıtı] *n* 1. təntənəlilik, təmtəraqlılıq; 2. şadlıq, şənlik, nəşə, dilxoşluq; mehribanlıq, ünsiyyət, yeyib-içməyə/kef etməyə həvəs/meyl göstərən

**convocate** ['kɔnvəkeıt] *v arx.* çağırmaq, dəvət etmək; təşkil etmək, toplamaq, yığmaq

**convocation** [.kɔnvə'keıʃn] *n* 1. çağırma, çağırılma; **the ~ of Parliament** parlamentin çağırılması; 2. Oksford və ya Darem universitetinin şurası; 3. ruhanilər məclisi *(protestant kilsəsində)*

**convoke** [kən'vouk] *v* çağırmaq, toplamaq; **to ~ Parliament** parlamenti çağırmaq; *When is the king going to convoke the new Parliament? Kral yeni parlamenti nə vaxt çağırmaq fikrindədir?*

**convolute** ['kɔnvəlu:t] *adj bot.* bükülmüş, burulmuş *(bitki yarpağı haq.)*

**convoluted** ['kɔnvəlu:tıd] *adj* 1. spiral kimi burulmuş, buruq, əyri-üyrü; girintili-çıxıntılı; əyilmiş; *Some sheep have convoluted horns Bəzi qoyunların buruq buynuzu olur;* ~ **like a ram's horn** qoç buynuzu kimi burulmuş; 2. dolaşıq, qarışıq, anlaşılması çətin; **a ~ explanation** dolaşıq /qarışıq / anlaşılması çətin izahat; **a ~ argument** dolaşıq / anlaşılmaz dəlil

**convolution** [.kɔnvə'lu:ʃn] *n* 1. burma, eşmə; 2. buruqluq; büküklük, əyrilik; 3. *anat.* beyin qırışları

**convolve** [kən'vɔlv] *v* burmaq, eşmək; burulmaq, eşilmək

**convolvulus** [kən'vɔlvjuləs] *n bot.* sarmaşıq

**convoy**[1] ['kɔnvɔı] *n* 1. müşayiət etmə, yanınca getmə; 2. nəqliyyat; 3. konvoyun nəzarəti altında olan əsirlərin kolonnası / sırası; 4. dəfn mərasimi

**convoy**[2] ['kɔnvɔı] *v hərb.* müşayiət etmək, yanınca getmək *(mühafizə məqsədilə)*

**convulse** [kən'vʌls] *v* 1. *(adətən məchulda işlənir)* titrətmək, əsdirmək, tərpətmək, silkələmək; *The island was convulsed by an earthquake Zəlzələ adanı titrətdi/silkələdi; The country is convulsed with civil war Ölkəni vətəndaş müharibəsi bürüyüb;* 2. ürpəşdirmək, qıc etmək; **to be ~d with colic** sancıdan əziyyət çəkmək/əzilib-büzülmək; **to be ~d with laughter** gülməkdən uğunmaq/uğunub getmək; **to be ~d with anger** acıqdan / qəzəbdən qovrulmaq; 3. qıc olub çırpınmaq



**convulsion** [kən'vʌlʃn] *n* 1. qıc, qıc olma; spazma, konvulsiya *(qıc olma)*; **to fall into a fit of** ~ qıc tutmasına məruz qalmaq, qıc olmaq; *He fell into a fit of convulsion O qıc oldu, O qıc tutmasına məruz qaldı;* **~s of laughter** coşğun gülüş / qəhqəhə; *Everyone at the party was in convulsions Qonaqlıqda olanlar gülməkdən uğundular; The child's nervous illness often threw him into convulsions Uşağın əsəb xəstəliyi onu tez-tez qıc edirdi;* 2. *ekol.* kataklizm, kəskin/ məhvedici / dağıdıcı çevriliş *(təbiətdə, cəmiyyətdə)*; ~ **of nature** təbiətin kataklizmi *(məs. zəlzələ, vulkan püskürməsi və s.)*; 3. sarsıntı, sarsıma, ictimai və siyasi həyəcan/qarışıqlıq; **civil ~s and riots** mülki çaxnaşma və iğtişaşlar

**convulsive** [kən'vʌlsıv] *adj* 1. coşğun, həyəcanlı, konvulsiv, konvulsiyalı; ~ **laughter** coşğun gülüş; ~ **attack** qıc olma tutması; 2. dağıdıcı, məhvedici; *The French Revolution was a convulsive historical event Fransa inqilabı dağıdıcı /məhvedici tarixi hadisə idi*

**convulsively** [kən'vʌlsıvlı] *adv* coşğun, hönkürə-hönkürə, tələşlı; **to weep** ~ hönkürə-hönkürə ağlamaq

**cony** ['kounı] *n d.d. zool.* krolik, evdovşanı

**conyburrow** ['kounı.bʌrou] *n* krolik yuvası

**cony-catch** ['kounıkætʃ] *v arx.* aldatmaq, fırıldaq gəlmək, fırıldaqçılıq etmək, adam aldatmaq, dələduzluq / hiyləgərlik etmək

**cony-catcher** ['kounı.kætʃə^r] *n* yalançı, adamaldadan, hiyləgər, kələkbaz, fırıldaqçı

**coo**[1] [ku:] *n* 1. quruldama *(göyərçin səsi)*; 2. şirin söhbət

**coo**[2] [ku:] *v* *(pr p* **cooing**; *pt, pp* **cooed)** 1. quruldamaq *(göyərçin haq.)*; 2. şirin-şirin söhbət etmək; **to ~ *one's* words** incə səslə danışmaq;

◊ **to bill and** ~ əzizləmək, nazlamaq, oxşamaq, sığallamaq

**cook**[1] [kuk] *n* 1. aşpaz; *John is a cook in the army Con orduda aşpazdır;* 2. *dən.* kok;

◊ *Every cook praises his own broth ≅ Heç kim öz ayranına turş deməz; Too many cooks spoil the broth ≅ Mamaça çox olanda, uşaq tərs gələr*

**cook**[2] [kuk] *v* 1. hazırlamaq *(yemək)*, bişirmək, qızartmaq; 2. bişmək, qızarmaq *(xörək haq.)*; *These apples don't cook well Bu almalar yaxşı bişmir (bişirməyə yaramır);* 3. bişmək, qovrulmaq *(isti havadan)*; **to be ~ed alive in the tropics** tropik istidən yanmaq/qovrulmaq; 4. *d.d.* saxtalaşdırmaq, saxtakarlıq etmək, uydurmaq, özündən düzəltmək, qondarmaq, toxumaq *(ən çox* **to ~ up**); **to ~ up a story** özündən əhvalat uydurmaq / toxumaq; **to ~ up charge** ittiham uydurmaq; **to ~ up account** hesabı saxtalaşdırmaq;

◊ **to ~ *one's* own goose** özü-özünə quyu qazmaq; **to ~ *smb.'s* goose** bir kəsə quyu qazmaq, bir kəsi məhv etmək; **to ~ a hare before catching him** ≅ çayı keçməmiş hop demək, dəryada balıq sövdəsi etmək

**cookee** [ku:'kı] *n amer.* aşpaz köməkçisi / şagirdi

**cooker** ['kukə^r] *n* 1. pilətə, peç, soba; 2. bişirilməli olan ərzaq; 3. bişirilə bilən meyvə *(heyva, alma və s.)*

**cookery** ['kukərı] *n* 1. aşpazlıq; *Boys as well as girls must be taught cookery in school Məktəbdə qızlar kimi oğlanlara da aşpazlıq öyrədilməlidir;* 2. *top.i* xörəklər; biş-düş

**cookery-book** ['kukərıbuk] *n* aşpazlıq kitabı

**cook-house** ['kukhaus] *n* 1. səyyar mətbəx; 2. *dən.* kambuz *(gəmi mətbəxi)*

**cooking** ['kukıŋ] *adj* 1. mətbəx, yemək; ~ **utensils** mətbəx alətləri/qabları; ~ **salt** mətbəx / yemək duzu; ~ **butter** mətbəx/yemək yağı; 2. bişirilə bilən, bişirilmək üçün yarayan; ~ **apples /cherries** bişirməyə yarayan alma / albalı

**cookout** ['kukaut] *n* gəzinti zamanı açıq havada hazırlanan xörək

**cook-room** ['kukru:m] *n* 1. mətbəx; 2. kambuz *(gəmidə mətbəx)*

**cook up** ['kukʌp] *v* uydurmaq, özündən düzəltmək; *Tom cooked up a story to explain why he was late for work, but his employer did not believe him Tom işə gecikməyinin səbəbini izah etmək üçün bir əhvalat uydurdu, lakin sahibkar ona inanmadı*

**cool**[1] [ku:l] *n* 1. sərinlik; **the ~ of the morning/of the evening / of the forest, *etc.*** səhərin / axşamın / meşənin sərinliyi; 2. sakitlik, soyuqqanlılıq, təmkin; **to keep *one's* ~** öz təmkinini saxlamaq/itirməmək; *Even if John annoys you, try and keep your cool Hətta Con belə səni/sizi əsəbiləşdirsə, sən/ siz çalışın təmkinini / təmkininizi itirmə/itirməyin;* **to blow / to lose *one's* ~** təmkinini/sakitliyini itirmək, özündən çıxmaq; *Don't loose your cool! Özündən /Özünüzdən çıxma/ çıxmayın*

**cool**[2] [ku:l] *adj* (-er, -est) 1. sərin; təmiz; ~ **morning /weather** sərin səhər / hava; ~ **wind** sərin külək; *A cool wind blew off the sea Dənizdən sərin külək əsdi;* **to get** ~ sərinləşmək; 2. yüngül *(paltar haq.)*; ~ **dress** yüngül paltar; *As it was a hot day she wore a cool dress Gün isti olduğu üçün/olduğuna görə, o, yüngül don geyinmişdi;* ~ **green house** istiliyi olmayan istilikxana/parnik; 3. sakit, soyuqqanlı; özünü itirməyən, təlaşa düşməyən, təmkinli; *Keep cool! Özündən çıxma, Özünüzdən çıxmayın; He is always cool in the face of danger O, təhlükə*

*qarşısında həmişə sakit/təmkinli/soyuqqanlı olur; He has a cool head O, sakit/təmkinli/soyuqqanlı adamdır;* 4. qaba, ədəbsiz, kobud; həyasız; ~ **behaviour** həyasız/ədəbsiz/ qaba/kobud davranış; 5. tam, düz, bütöv *(rəqəm haq.);* **to lose a ~ thousand** düz min manat itirmək; **to walk a ~ twenty miles further** düz irəliyə doğru iyirmi mil getmək;

◊ ~ **beggar/hand** həyasız, abırsız, sırtıq; *What cool cheek! Bu nə həyasızlıqdır!;* **as ~ as a cucumber** tam təmkinli / soyuqqanlı

**cool**[3] [ku:l] *v* 1. sərinləşdirmək, soyutmaq; **to ~ *one's* tea** çayını soyutmaq; *The rain cooled the air Yağış havanı sərinləşdirdi;* **to ~ eagerness** ehtirası soyutmaq; 2. sərinləşmək, soyumaq; *Let your tea cool a little before you drink it İçməzdən əvvəl qoy/qoyun çayın / çayınız bir az soyusun;* 1) **to ~ down, to ~ off** soyutmaq, sərinlətmək, soyumaq, sərinləmək; *We stopped to let our horses to cool down Biz dayandıq ki, atlarımızın təri soyusun;* 2) sakitləşmək, özünə gəlmək, sakit olmaq; *She is quick to get angry and slow to cool down O tez hirslənir, lakin gec soyuyur / sakitləşir; His anger has cooled down Onun hirsi / qəzəbi soyuyub;*

◊ **to ~ *one's* heel** gözləməyə məcbur edilmək

**coolant** ['ku:lənt] *n tex.* yağlama-soyutma mayesi *(metalı və s. kəsərkən)*

**cooler** ['ku:lə[r]] *n* 1. sərinləşdirici içki və s.; 2. *tex.* soyuducu; radiator; 3. *id.* oyundan kənar edilən/qovulmuş oyunçuların oturduğu skamya; 4. *amer. jarq.* həbsxana, qala

**cool-headed** ['ku:l'hedıd] *adj* sakit, təmkinli, soyuqqanlı; **a ~ gentleman** sakit / təmkinli / soyuqqanlı centlmən

**cooling** ['ku:lıŋ] *adj* soyuducu; ~ **jacket** *tex.* soyuducu köynək; ~ **pond** *tex.* soyuducu hovuz; ~ **tower** *tex.* soyuducu qurğu

**coolish** ['ku:lıʃ] *adj* soyuqtəhər

**coolly** ['ku:lı] *adv* 1. soyuq, sərin; *He received my suggestion coolly O mənim təklifimi soyuq qarşıladı;* 2. soyuqqanlılıqla, təmkinlə

**coolness** ['ku:lnıs] *n* 1. sərinlik; **the ~ of the evening** axşamın sərinliyi; 2. soyuqqanlılıq, sakitlik; 3. soyuqluq; *There is a coolness between the two friends İki dost arasında soyuqluq var*

**coom** [ku:m] *n* I 1. kömür külü; 2. taxta kəpəyi, mişarağzı

**coop**[1] [ku:p] *n* I 1. toyuq hini; quş və ya evdovşanı üçün qəfəs; 2. torba, tor *(balıq tutmaq üçün);* 3. *amer. dial.* həbsxana, qala

**coop** [ku:p] *n* II balaca topa *(peyin, gübrə və s.)*

**coop**[2] [ku:p] *v* toyuq hininə /qəfəsə salmaq

**cooper**[1] ['ku:pə[r]] *n* çəlləkçi, boçkaçı, çəllək / boçka qayıran

**cooper**[2] ['ku:pə[r]] *v* 1. çəlləkçiliklə/boçkaçılıqla məşğul olmaq, çəllək / boçka qayırmaq; 2. çəlləkdə / boçkada saxlamaq

**cooperage** ['ku:pərıdʒ] *n* 1. çəllək / boçka qayırma sənəti; 2. çəllək / boçka qayırma emalatxanası; 3. çəllək/boçka qayırma işinə verilən haqq / muzd / ödəmə

**co-operant** [kou'ɔpərənt] *adj* kömək/yardım edən; ~ **factors of human progress** bəşəriyyətin inkişafına kömək edən amillər

**cooperate** [kɔu'ɔpəreıt] *(həm də* **co-operate)** *v* 1. əməkdaşlıq etmək, bir yerdə işləmək; **to ~ with friends in starting a newspaper** dostlarla bir yerdə qəzet buraxmaq; *The British cooperate with the French in building a plane Britaniyalılar yeni təyyarə istehsal etmək üçün fransızlarla əməkdaşlıq edir; Let's cooperate to set the work done quickly İşi tez görmək üçün gəlin bir yerdə işləyək;* 2. kömək etmək, imkan yaratmaq, səbəb olmaq; **to ~ to the success of *smth.*** bir şeydə müvəffəqiyyətə nail olmaq üçün imkan yaratmaq/kömək etmək; *The weather and the scenery co-operated to make our holiday a success Hava və mühit bizim istirahətimizin yaxşı keçməsinə səbəb oldu/ şərait yaratdı;* 3. birləşmək, birləşdirmək, kooperativləşmək, kooperativləşdirmək; 4. qarşılıqlı təsir etmək, bir-birinə təsir göstərmək

**cooperation** *(həm də* **co-operation)** [kou,ɔpə'reıʃn] *n* 1. əməkdaşlıq, əməkdaşlıq etmə, bir yerdə işləmə; **in ~ with *smb.*** bir kəslə əməkdaşlıq etmə; **international/scientific/cultural ~** beynəlxalq/elmi / mədəni əməkdaşlıq; **to work in close ~ with *smb.*** bir kəslə sıx əməkdaşlıqla işləmək; *I need your cooperation in this matter Bu məsələdə mənim sənin / sizin əməkdaşlığına / əməkdaşlığınıza ehtiyacım var;* 2. qarşılıqlı təsir; 3. kooperasiya

**cooperative**[1] *(həm də* **co-operative)** [kou'ɔpərətıv] *n* 1. kooperativ təşkilatı/cəmiyyəti; 2. kooperativ təşkilatının üzvü; *The bicycle factory is now a workers' cooperative İndi velosiped zavodu fəhlələrin kooperativ təşkilatıdır*

**cooperative**[2] *(həm də* **co-operative)** [kou'ɔpərətıv] *adj* 1. birgə, birləşmiş, kollektiv, müştərək; ~ **bank** birləşmiş bank; 2. korporasiya, kooperativ; **a ~ firm** kooperativ firma; ~ **society** kooperativ/korporasiya cəmiyyəti; ~ **movement** kooperativ hərəkatı; *The farmer and his neighbours decided to establish a cooperative farm Fermer və onun qonşuları kooperativ ferma yaratmağı/təşkil etməyi qərara aldılar*

**cooperator** *(həm də* **co-operator)** [kou'ɔpəreıtə] *n* 1. əməkdaş; 2. kooperator

**coopery** ['kupərı] *n* 1. çəlləkçilik/boçkaçılıq işi; 2. çəllək/boçka qayırma emalatxanası

**co-opt** [kou'ɔpt] *v* kooptasiya etmək *(seçkisiz olaraq öz heyətinə yeni üzv daxil etmək)*

**coordinate**[1] [kou'ɔ:dnıt] *(həm də* **co-ordinate)** *n* 1. bərabər, tən, eyni, tay, tay-tuş *(vəziyyətə və s. görə);* 2. *riyaz.* koordinat *(nöqtənin vəziyyətini təyin edən ədəd)*



**coordinate**[2] [kou'ɔ:dnıt] *(həm də* **co-ordinate)** *adj* 1. bərabər, eyni qəbildən; sərbəst; 2. uyğunlaşdırılmış; uzlaşdırılmış; razılaşdırılmış; yekdil, birgə; 3. *gram.* tabesiz *(cümlə haq.);* ~ **clause** tabesiz cümlə; **a ~ composite sentence** tabesiz mürəkkəb cümlə; 4. *riyaz.* koordinat; ~ **curve** koordinat əyrisi

**coordinate**[3] *(həm də* **co-ordinate)** [kou'ɔ:dıneıt] *v* 1. uyğunlaşdırmaq, uzlaşdırmaq, əlaqələndirmək; **to ~ *one's* movements in swimming** üzən zaman hərəkətləri uzlaşdırmaq/əlaqələndirmək; **to ~ policies** siyasi kursu əlaqələndirmək / uzlaşdırmaq; **~d attack** *hərb.* əlaqələndirilmiş hücum; 2. birgə hərəkət etmək

**coordinating** [kou'ɔ:dıneıtıŋ] *(həm də* **co-ordinating)** *adj* birləşdirici; ~ **conjunctions** *gram.* birləşdirici bağlayıcılar

**coordination** [kou,ɔ:dı'neıʃn] *(həm də* **co-ordination)** *n* 1. koordinasiya, uyğunlaşdırma, əlaqələndirmə; **the ~ of the work of several people** bir neçə adamın işini əlaqələndirmə; ~ **of muscular movements** əzələ hərəkətlərini əlaqələndirmə; 2. *gram.* tabesiz/tabesizlik əlaqəsi

**coot** [ku:t] *n* 1. *zool.* qaşqaldaq *(quş);* 2. *d.d.* sadədil, sadəlövh; gic, axmaq, avara, səfeh;

◊ **as bald as a ~** daz, dazbaş; **as stupid as a ~** ≅ dəyənək, gic, səfeh, giclərin gici

**co-owner** [kou'ounə[r]] *n* şərik, ortaq

**cop**[1] [kɔp] *n* I *d.d. kob.* 1. polis nəfəri; 2. tutma, tutulma, yaxalama, yaxalanma, ələ keçmə; **fair ~** cinayət yerində yaxalanma

**cop** [kɔp] *n* II 1. *dial.* torpaq yığını *(quyu qazarkən əmələ gələn və s.);* 2. *dial.* kiçik təpə; 3. *tox.* dükçə *(iyə sarınmış və ya iydən çıxarılmış sap / iplik);* 4. *d.d.* kəkil *(quşlarda)*

**cop**[2] [kɔp] *v* **(-pp-)** I 1. *arx., kob.* tutmaq, yaxalamaq, ələ keçirmək; **to ~ *smb.* at** bir kəsi cinayət başında yaxalamaq/tutmaq; 2. *jarq.* oğurlamaq, çırpışdırmaq, qamarlamaq

**cop** [kɔp] *v* **(-pp-)** II *dial.* topalamaq, topa vurmaq, dırmıqlayıb yığmaq

**cope**[1] [koup] *n* 1. *kils.* cübbə *(ibadət zamanı ruhanilərin geydiyi üst paltarı);* 2. örtük; **under the ~ of night** gecənin örtüyü altında; 3. *şair.* göy qübbəsi; **starry ~** ulduzlu göy qübbəsi

**cope**[2] [koup] *v* I **(with)** öhdəsindən gəlmək, bacarmaq, bacara bilmək; **to ~ with difficulties** çətinliyin öhdəsindən gəlmək; **to ~ with danger** təhlükəni aradan qaldıra bilmək

**cope** [koup] *v* II *ovç.* dimdiyini və ya caynağını kəsmək *(şahinin)*

**cope** [koup] *v* III *dial.* dəyişdirmək; mübadilə ticarəti ilə məşğul olmaq

**copeck** ['koupek] *n* qəpik

**copeman** ['koupmən] *n* *(pl* **-men** [-mən]) *arx.* xırdavatçı, çərçi, xırdavatsatan *(adam)*

**copier** ['kɔpıə[r]] *n* üzünü köçürən / ağardan, surət çıxardan

**copilot** [kou'paılət] *n av.* ikinci pilot / təyyarəçi

**copious** ['koupjəs] *adj* bol, çox; zəngin; məhsuldar; ~ **harvest** bol məhsul; ~ **material** çox /bol material; ~ **information** zəngin/ətraflı məlumat; ~ **display of flowers** zəngin / çiçək sərgisi; ~ **supply of goods** çox/bol ərzaq ehtiyatı; ~ **vocabulary** zəngin söz ehtiyatı; ~ **writer** məhsuldar yazıçı; *Agatha Christie was one of copious British writers Aqata Kristi məhsuldar Britaniya yazıçılarından biri idi / olmuşdur;*

◊ ~ **style** təmtəraqlı üslub; ~ **speaker** gopçu, boşboğaz, çərənçi

**copiously** ['koupjəslı] *adv* bol, bol-bol, bolluca, çoxluca

**copiousness** ['koupjəsnıs] *n* bolluq, çoxluq, var-dövlət, sərvət, zənginlik; barlılıq, məhsulluluq, səmərəlilik

**copper**[1] ['kɔpə[r]] *n* 1. mis, qırmızı mis; 2. mis və ya gümüşdən kəsilmiş pul; 3. mis qazan *(xüs. gəmidə və ya camaşırxanada);*

◊ **to cool *one's* ~s** içmək *(sərxoşluğun səhəri)*

**copper**[2] ['kɔpə[r]] *adj* 1. mis; ~ **kettle/wire** mis çaydan/məftil; 2. mis-qırmızı, mis kimi qırmızı *(rəng haq.)*

**copper**[3] ['kɔpə[r]] *v* üzərinə mis çəkmək, üstünü mislə örtmək

**copperas** ['kɔpərəs] *n kim.* dəmir kuporosu *(dəmirli sulfat duzu)*

**copper-bit** ['kɔpəbıt] *n* lehim aləti, hövnə

**copper-bottomed** ['kɔpə'bɔtəmd] *adj* 1. etibarlı, mötəbər, sədaqətli; bel bağlanıla bilən; ~ **promises** etibarlı/mötəbər vədlər; **a ~ guarantee** etibarlı zəmanət; 2. altına mis örtük çəkilmiş *(gəmi, qazan və s.)*

**copper-captain** ['kɔpə,kæptın] *n* yalançı/fırıldaqçı kapitan

**copper-coloured** ['kɔpə'kʌləd] *adj* mis rəngli

**copper-faced** ['kɔpəfeıst] *adj* utanmaz, abırsız, həyasız, sırtıq, qırmızısifət

**Copperhead** ['kɔpəhed] *n zool.* Şimali Amerikada yaşayan zəhərli ilan növü

**copper-head** ['kɔpəhed] *n* mis çaynikin və ya qazanın qapağı

**copper-nose** ['kɔpənouz] *n* qırmızı burun

**coppery** ['kɔpərı] *adj* 1. misli; tərkibində mis olan; 2. mis rəngli; misəbənzər *(rəng haq.)*

**copple-crown** ['kɔplkraun] *n dial.* kəkil *(quşlarda)*

**co-production** ['kouprə'dʌkʃn] *n kino* birgə istehsal

**cops** [kɔps] *n* qapı və ya darvaza üçün rəzə

**copter** ['kɔptə[r]] *n* **helicopter** *sözünün qısa forması*

**copular** ['kɔpjulə] *n (pl həm də* **-lae)** 1. *qram., mənt.* bağlayıcı fel, kopula; 2. *anat.* bənd, bağ

**copulae** ['kɔpju:lı] *n* **copular** *isminin cəm forması*

**copulate** ['kɔpjuleıt] *v biol.* cinsi əlaqədə olmaq, cinsi əlaqəyə girmək; cütləşmək *(heyvan və s.),* cütləşdirmək *(heyvanı və s.)*

**copulation** [.kɔpju'leıʃn] *n* **1.** *biol.* kopulyasiya *(birhüceyrəlilərdə cütləşmə prosesi);* **2.** birləşmə, birləşdirmə; əlaqə; ~ **of ideas** fikirlərin / ideyaların birləşməsi / əlaqəsi; **3.** *bot.* çubuq calağı, peyvənd

**copulative**[1] ['kɔpjulətıv] *n qram.* birləşdirici bağlayıcı

**copulative**[2] ['kɔpjulətıv] *adj qram.* **1.** birləşdirici, birləşdirən; **a ~ conjunction** birləşdirici bağlayıcı; **2.** *biol.* cinsiyyət

**copy**[1] ['kɔpı] *n* **1.** nüsxə; **to have some copies of a book** kitabın bir neçə nüsxəsinə malik olmaq; **advance/complimentary** ~ siqnal/müəllif nüsxəsi; **2.** surət; ~ **of a letter/document** məktubun/sənədin surəti; **rough** ~ qaralama; **fair** ~ ağlama *(yazının təmiz yazılmış variantı);* **attested / certified** ~ təsdiq edilmiş surət; **true** ~ həqiqi surət; **carbon** ~ yazı makinasında yazılmış surət; **to take / to make a ~ of a document** sənədin surətini çıxartmaq; *John asked his secretary to make him 4 copies of the letter Con katibəsindən xahiş etdi ki, məktubun 4 nüsxəsini çıxartsın;* **3.** reproduksiya, surət *(portretin və s.); This is a copy of a well-known picture Bu məşhur şəklin reproduksiyasıdır / surətidir;* **4.** əlyazması, çapa hazırlanan material; *The printers demand copy at once Mətbəəçilər əlyazmasını dərhal tələb edir*

**copy**[2] ['kɔpı] *v* (*pt, pp* **copied**) **1.** üzünü / surətini çıxartmaq; **to ~ a document** sənədin üzünü/surətini çıxartmaq; **2.** köçürmək *(başqasından); You copied this work off Tom, I know, because you've made exactly the same mistake Bilirəm, sən / siz bu işi Tomdan köçürmüsən /köçümüsünüz, çünki sən/siz eyni səhvi edibsən/ edibsiniz;* **3.** təqlid etmək; oxşatmaq *(özünü bir kəsə); Jane always copies the way I dress Ceyn geyimdə həmişə məni təqlid edir / özünü mənə oxşadır*

**copybook** ['kɔpıbuk] *n* **1.** yazı nümunəsi olan dəftər, yazı nümunəsi; **2.** *amer.* dəftər

**copyboy** ['kɔpıbɔı] *n* qəzet ofisində adi işləri görən cavan oğlan

**copycat** ['kɔpıkæt] *n* **1.** kor-koranə başqalarını təqlid edən adam *(davranışda, geyimdə və s.);* **2.** məktəbdə həmişə özgələrinin işini köçürən uşaq / şagird

**copist** ['kɔpıst] *n* **1.** üzünü köçürən/ağardan, surət çıxardan; **2.** təqlidçi, təqlid edən *(adam)*

**copyright**[1] [kɔpıraıt] *n* müəlliflik hüququ; ~ **reserved** müəllifik hüququ saxlanılır *(müəllifin icazəsi olmadan əsəri yenidən çap etmək olmaz)*

**copyright**[2] ['kɔpıraıt] *v* müəlliflik hüququnu təmin etmək; *This book is copyrighted Bu kitabın müəlliflik hüququ qorunur*

**coquet**[1] [kou'ket] *adj arx.* = **coquettish**

**coquet**[2] [kou'ket] *v* (**with**) naz etmək, əzilib-büzülmək; qır vermək

**coquetry** ['koukıtrı] *n* naz, işvə, qəmzə; əzilib-büzülmə

**coquette** [kou'ket] *n fr.* işvəkar, cilvəli, nazlı, qəmzəli *(geyimi və ya ədası ilə kişilərin xoşuna gəlməyə çalışan qadın/qız)*

**coquettish** [kou'ketıʃ] *adj* nazlı, işvəli; qəmzəli, cilvəli; **a ~ smile** qəmzəli/işvəli təbəssüm; **a ~ manner** işvəli / qəmzəli / nazlı davranış

**coquettishly** [kou'ketıʃlı] *adv* işvə/qəmzə ilə, nazla, işvəkarcasına; **to speak** ~ nazla/işvə ilə danışmaq

**cor**[1] [kɔ:] *n mus.* valtorna *(nəfəslə çalınan halqavarı musiqi aləti)*

**cor**[2] [kɔ:] *inter.* bəh-bəh! *(Təəccüb, heyranlıq və s. ifadə edir) Cor, look at that view! Bəh-bəh! Bir bu mənzərəyə bax! / baxın!*

**coral**[1] ['kɔrəl] *n* **1.** mərcan; **2.** mərcan rəngli; **3.** cilalanmış mərcandan qayrılmış oyuncaq *(diş çıxaran uşaqlar üçün)*

**coral**[2] ['kɔrəl] *adj* mərcan rəngli; ~ **lipstick** mərcan rəngli pomada

**coral-island** ['kɔrəl.aılənd] *n* mərcan adası

**Coran** [kɔ'ra:n] *n* Quran

**cord**[1] [kɔ:d] *n* **1.** kəndir *(nazik);* **2.** *anat.* tel; **vocal ~s** səs telləri; **3.** *anat.* onurğa beyni, haram ilik; **4.** *anat.* göbəkbağı; **5.** *tex.* şnur *(izolyasiya edilmiş elektrik məftili);* **6.** *toxuc.* kord *(möhkəm parça növü)*

**cord**[2] [kɔ:d] *v* kəndirlə bağlamaq

**corded** ['kɔ:dıd] *adj* kəndirlə bağlanmış

**cordial**[1] ['kɔ:djəl] *n* **1.** ürək fəaliyyətinə kömək edən dərman; **2.** bərk ətirli şirinləşdirilmiş içki *(likör və s.)*

**cordial**[2] ['kɔ:djəl] *adj* **1.** səmimi; mehriban; ~ **thanks** səmimi təşəkkür; ~ **welcome** səmimi qəbul; ~ **smile** səmimi təbəssüm; **2.** dərin, böyük; ~ **liking** dərin simpatiya; **3.** tünd, bərk; ~ **drink** tünd / bərk içki

**cordiality** [.kɔ:dı'ælıtı] *n* **1.** səmimilik, sədaqət, mehribanlıq, istiqanlılıq, üzügülərlilik; **2.** mehribanlıq/səmimilik/istiqanlılıq ifadəsi

**cordially** ['kɔ:djəlı] *adv* səmimiyyətlə, hərarətlə, sədaqətlə, mehribanlıqla, ürəkdən, qəlbdən

**cordiform** ['kɔ:dı:fɔ:m] *adj* ürəyəoxşar, ürəkşəkilli, ürəyəbənzər

**cordon** ['kɔ:dən] *n hərb.* kordon *(sərhəd mühafizə dəstəsi; qarovul xətti);* qoruma, mühafizə etmə, mühafizə, müdafiə; **police** ~ polis kordonu

**core**[1] [kɔ:] *n* **1.** özək; iç; **the ~ of an apple** almanın özəyi /içi; **the ~ of a corn** döyənəyin özəyi; **rotten to the** ~ özəyinə qədər çürümüş; *He is English to the core O, iliyinə qədər ingilisdir;* **2.** mahiyyət, can, məğz; **the ~ of a subject** məsələnin canı / məğzi / mahiyyəti

**core**[2] [kɔ:] *v* özəyini çıxartmaq *(almanın və s.)*

**coreless** ['kɔ:lıs] *adj* özəksiz, özəyi olmayan; içiboş

**corer** ['kɔ:rə] *n* meyvənin özəyini çıxartmaq üçün maşın



**co-respondent** ['kourıs.pɔndənt] *n hüq.* boşanma işində ikinci cavabdeh

**corf** [kɔ:f] *n* (*pl* **corves**) **1.** *tar.* kömür daşımaq üçün səbət; **2.** mədən vaqonetkası; **3.** diri balıq saxlamaq üçün xüsusi çay gəmisi; səbət *(diri balıq üçün)*

**coriaceous** [.kɔrı'eıʃəs] *adj* **1.** dərili, dəri/ gön kimi, bərk; **2.** dəridən/göndən hazırlanmış

**cork**[1] [kɔ:k] *n* **1.** probka ağacının qabığı; **2.** tıxac, probka; **3.** üzgəc; **4.** *bot.* floema, alt qabıq, lub; lif

**cork**[2] [kɔ:k] *v* **1.** probka ilə bağlamaq; **2.** saxlamaq, gizlətmək *(hissi və s.)*

**corkage** ['kɔ:kıdʒ] *n* butulkanı tıxama/bağlama

**corked** [kɔ:kt] *adj* probka ilə bağlanmış

**corker** ['kɔ:kə'] *n* **1.** butulka bağlamaq üçün maşın; **2.** *d.d.* dəhşətli yalan və s.

**corking** ['kɔ:kıŋ] *adj d.d.* çox gözəl / yaxşı, heyran doğurucu

**cork-oak** ['kɔ:k'ouk] *n bot.* probka palıdı

**corkscrew** ['kɔ:kskru:] *n* burğu, probkaaçan

**cork-tree** ['kɔ:ktri:] *n bot.* probka ağacı

**corkwood** ['kɔ:kwud] *n bot.* probka ağacı

**corm** [kɔ:m] *n bot.* soğanaq *(bitkilərdə)*

**cormorant** ['kɔ:mərənt] *n zool.* **1.** qarabataq *(böyük quş);* **2.** qarınqulu, çoxyeyən

**corn**[1] [kɔ:n] *n* I **1.** *top.i* taxıl; buğda *(xüs. İngiltərədə);* vələmir *(xüs. Şotlandiyada);* qarğıdalı *(xüs. Amerikada);* **2.** dənli bitkilər; **3.** tum, çəyirdək *(almada, bibərdə və s.);* **4.** *amer.* qarğıdalı arağı;

◊ **to measure another's ~ by *one's* own bushel** başqasının taxılını öz çanağı ilə ölçmək, ≅ öz arşını ilə ölçmək

**corn** [kɔ:n] *n* II döyənək, qabar;

◊ **to tread on *smb.'s* pet ~** bir kəsin döyənəyini basmaq/yaralı yerinə toxunmaq

**corn**[2] [kɔ:n] *v* **1.** taxıl *(buğda),* qarğıdalı və s. səpmək; **2.** duzlamaq, duza qoymaq *(əti və s.);* **3.** dən bağlamaq *(sünbül);* **4.** *d.d.* sərxoş / məst etmək, kefləndirmək

**cornchop** ['kɔ:ntʃɔp] *n* qarğıdalı yarması, yem üçün qarğıdalı unu

**corn cleaner** ['kɔ:nklı:nə'] *n* taxıltəmizləyən / ələyən maşın

**corn-cob** ['kɔ:nkɔb] *n amer. bot.* qarğıdalı qıçasının özəyi

**corn crusher** ['kɔ:n.krʌʃə'] *n k.t.* qarğıdalı döyən maşın

**corn cutter** ['kɔ:n.kʌtə'] *n k.t.* qarğıdalı doğrayan / kəsən *(maşın)*

**cornea** ['kɔ:nıə] *n anat.* buynuz təbəqə *(gözdə)*

**corn ear** ['kɔ:nıə'] *n* qarğıdalı qıçası

**corned** [kɔ:nd] *adj* **1.** dən-dən edilmiş, dənələnmiş; **2.** duzlu, duzlanmış; ~ **beef** duzlanmış / qaxac ət; **3.** taxılla dolmuş; **4.** *d.d.* sərxoş, kefli

**corneitis** [.kɔ:nı'aıtıs] *n tib.* keratit *(gözün buynuz təbəqəsinin iltihabı)*

**cornel** ['kɔ:nəl] *n bot.* zoğal

**cornelian cherry** [kɔ:'nı:ljən.tʃerı] *n bot.* = **cornel**

**corneous** ['kɔ:nıəs] *adj* buynuzşəkilli, buynuzaoxşar, buynuzvarı, buynuz kimi

**corner**[1] ['kɔ:nə'] *n* **1.** künc; guşə; tin; **in the ~ of the room** otağın küncündə; **at the ~ of the street** küçənin tinində; *A square has four corners Kvadratın dörd küncü olur; When I turned the corner (of the street), he had disappeared Mən küçənin tinini dönəndə o, gözdən itmişdi; He hit his knee on the corner of the table O, dizini stolun tininə vurdu;* **round the ~** tinin dalında/arxasında; lap yaxında; **to turn the ~** tini dönmək; **to cut off a ~** küncü kəsmək, birbaşa/düz getmək; **to watch *smb.* out of the ~** bir kəsə gözünün ucu ilə baxmaq, bir kəsə xəlvəti baxmaq/nəzər yetirmək; **2.** dalan; xəlvəti yer/ künc; **murky ~s** qaranlıq / xəlvəti yer, xəlvəti / gizli sığınacaq; **in a quiet ~** sakit/səssiz-küysüz/xəlvəti yerdə; **3.** bölgə, rayon, hissə; **the four ~s of the earth** dünyanın dörd hissəsi; **4.** *id.* **1)** meydanın küncü; **2)** küncdən zərbə, künc zərbəsi;

◊ **tight ~** çətin və ya təhlükəli vəziyyət; **to be round the ~** təhlükədən uzaq olmaq; **to turn the ~ 1)** çətin yaxud təhlükəli vəziyyətdən çıxmaq; *He has been seriously ill, but has turned the corner O, ciddi xəstə idi, lakin təhlükə sovuşub;* **2)** *hərb.* fərarilik etmək, əsgəri xidmətdən qaçmaq; **to drive/to put *smb.* into a ~** bir kəsi küncə sıxmaq, bir kəsi çətin vəziyyətə salmaq; **to have a ~ in *smb.'s* heart** bir kəsin qəlbində yeri olmaq, bir kəsin qəlbinə girmək

**corner**[2] ['kɔ:nə'] *v* **1.** küncə sıxmaq, çıxılmaz vəziyyətə salmaq; *That question cornered me O məsələ məni çətin/çıxılmaz vəziyyətə saldı;* **2.** küncə qoymaq; **3.** *tic.* alver etmək üçün/məqsədilə mal almaq; **to ~ market** malları almaqla bazarı öz əlinə keçirmək; inhisara almaq; **to ~ market in silver** bazarda gümüş satışını inhisara almaq

**cornered** ['kɔ:nəd] *adj* **1.** künclü, küncü olan; **a three-cornered hat** üç künclü / küncü olan papaq; **a four-cornered table** dördkünclü stol / miz; **2.** çətin / çıxılmaz vəziyyətə düşmüş

**corner-kick** ['kɔ:nəkık] *n id.* künc zərbəsi, küncdən zərbə

**corner-man** ['kɔ:nəmən] *n* (*pl* **-men** [mən]) **1.** zəncilərin mahnı ansamblında komik rol oynayan; **2.** küçədə avara-avara/veyl-veyl gəzən *(adam)*

**corner-stone** ['kɔ:nəstoun] *n* **1.** künc daşı; **2.** təməl daşı; **the ~ of a phylosophical system** fəlsəfi sistemin təməl daşı *(əsası)*

**corner wise** ['kɔ:nəwaız] *adv* çəp, çəpinə, çəpəki

**cornet** ['kɔ:nıt] *n* kornet *(bürüncdən hazırlanmış musiqi aləti)*

**corn-exchange** ['kɔ:nıks'tʃeındʒ] *n* taxıl birjası

**cornfactor** ['kɔ:n.fæktəʳ] n taxıl alverçisi
**cornfield** ['kɔ:nfi:ld] n 1. tarla, zəmi, taxıl zəmisi; 2. amer. qarğıdalı tarlası / zəmisi
**corn-flag** ['kɔ:nflæg] n bot. qladiolus, qarğasoğanı (iri çiçəkli dekorativ bitki)
**corn-flakes** ['kɔ:nfleɪks] n pl amer. qarğıdalı partlağı
**corn-flour** ['kɔ:nflauəʳ] n qarğıdalı unu; düyü unu və digər dənli bitkilərin unu
**corn-flower** ['kɔ:nflauəʳ] n bot. peyğəmbərçiçəyi (açıq-göy rəngli çöl çiçəyi)
**cornice** ['kɔ:nɪs] n mem. karniz; çıxıntı, zeh, qıraq, kənar
**corn-worm** ['kɔ:nwə:m] n qarğıdalı qurdu / kəpənəyi
**corny** ['kɔ:nɪ] adj I köhnə dəbli, dəbdən düşmüş; bayağı, çeynənmiş, şit; a ~ joke bayağı/şit zarafat; a ~ song bayağı/dəbdən düşmüş mahnı; a ~ film dəbdən düşmüş film
**corny** ['kɔ:nɪ] adj II qabarlı, döyənəkli; ~ hands qabarlı əllər; The old gardener had corny hands Qoca bağbanın qabarlı əlləri vardı
**corporal** ['kɔ:pərəl] adj cismi, cismani; bədən; ~ punishment cismani cəzası; ~ needs cismani tələbatlar; ~ defects bədən defektləri / qüsurları
**corporality** [.kɔ:pə'rælɪtɪ] n maddilik, cismilik; cismanilik
**corporate** ['kɔ:pərɪt] adj korporativ; korporasiyaya aid olan; ~ body hüquqi şəxs; ~ property korporativ əmlak; ~ town muxtariyyəti olan şəhər
**corporation** [.kɔ:pə'reɪʃn] n 1. təşkilat, ittifaq, cəmiyyət, korporasiya; trading ~ ticarət korporasiyası; 2. amer. səhmdar cəmiyyəti; 3. hüq. hüquqi şəxs; 4. bələdiyyə, bələdiyyə idarəsi; 5. kob. qarın
**corporator** ['kɔ:pəreɪtəʳ] n korporasiya üzvü; bələdiyyə üzvü
**corporeal** [kɔ:'pɔ:rɪəl] adj cismani; maddi
**corporeity** [.kɔ:pɔ:'ri:ɪtɪ] n cismanilik, cismilik; maddilik
**corps** [kɔ:ʳ] n (cəmdə forma dəyişmir, ancaq tələffüzü dəyişir: [kɔ:z] 1. korpus; Corps diplomatique fr. diplomatik korpus; 2. hərb. korpus (hərbi vahid); 3. tələbə cəmiyyəti (Almaniya universitetlərində)
**corpse** [kɔ:ps] n cəsəd, meyit, nəş, cənazə; The corpse was not recognizable Meyit / Cəsəd tanınmaz idi
**corpulence** ['kɔ:pjuləns] n köklük, tosqunluq, piylənmə; dolğunluq
**corpulent** ['kɔ:pjulənt] adj kök, tosqun, dolğun, piylənmiş
**corpus** ['kɔ:pəs] n (pl corpora) lat. 1. bədən, gövdə (insan və ya heyvan haq.); 2. toplu, külliyat, məcmuə (sənəd və s. haq.); the ~ of Azerbaijani poetry Azərbaycan poeziyası külliyatı/antologiyası; the entire ~ of Milton's works Miltonun bütün əsərlərinin külliyatı / toplusu
**corpuscle** ['kɔ:pʌsl] n 1. zərrəcik, cisimcik; red/white ~s fiziol. qırmızı/ağ qan cisimcikləri; 2. fiz. korpuskul (maddənin hissəciyi)
**corpuscular** [kɔ:'pʌskjuləʳ] adj fiz. korpuskulyar; ~ theory of light işığın kopuskulyar nəzəriyyəsi
**corral[1]** [kɔ'ra:l] n 1. heyvan üçün ağıl/xalxal; 2. vəhşi heyvanları tutmaq üçün xalxal
**corral[2]** [kɔ'ra:l] v 1. heyvanı ağıla / xalxala salmaq; 2. mənimsəmək, sahib çıxmaq
**correct[1]** [kə'rekt] adj 1. düz, doğru, dəqiq; ~ answer doğru/düz cavab; ~ calculation doğru / dəqiq kalkulyasiya (malın maya və satış qiymətinin hesablanması); ~ time dəqiq vaxt; The description is absolutely correct Təsvir tamamilə doğrudur; 2. müvafiq, uyğun gələn; What's the correct dress for a wedding? Toy üçün uyğun olan paltar hansıdır?
**correct[2]** [kə'rekt] v 1. düzəltmək; to ~ mistakes /translation səhvləri/tərcüməni düzəltmək; to ~ one's watch by the radio saatını radio ilə düzəltmək; Please correct my pronunciation if I go wrong Zəhmət olmasa, səhv etsəm mənim tələffüzümü düzəlt/düzəldin; 2. irad tutmaq, çatışmazlıqları göstərmək; to ~ a child for disobedience itaətsizlik etdiyinə görə uşağa cəza vermək; 3. düzəltmək, yoxlayıb düzəltmək; to ~ printer's proofs qrankanı düzəltmək/oxuyub səhvləri düzəltmək
**correction** [kə'rekʃn] n 1. düzəldilmə, düzəliş, təshih; to make ~ düzəliş / təshih etmək; Teachers usually make correction in red ink Müəllimlər adətən düzəlişi qırmızı mürəkkəblə edirlər; Your work still contains mistakes which need correction Sənin/Sizin işində/işinizdə hələ də səhvlər var, onları düzəltmək lazımdır; 2. cəza, islah olunma; house of ~ arx. islah olunma evi; The prisoner was sent to a labour camp for correction Dustağı islah olunmaq üçün islah əmək koloniyasına göndərdilər
**corrective[1]** [kə'rektɪv] n düzəliş, islah, düzəldilmə, dəyişib düzəltmə / islah etmə
**corrective[2]** [kə'rektɪv] adj islahedici, düzəldici; ~ punishment islahedici cəza; ~ training islahedici həbs; The criminals were sent to prison for corrective punishment Cinayətkarları islahedici cəza çəkmək üçün həbsxanaya göndərdilər
**correctively** [kə'rektɪvlɪ] adv islahedici bir tərzdə, islah etmək üçün / məqsədilə
**correctly** [kə'rektlɪ] adv 1. düz, doğru, düzgün; to answer ~ düz/düzgün/doğru cavab vermək; The student answered quite correctly Tələbə tamamilə düz / doğru / düzgün cavab verdi; 2. ədəblə, nəzakətlə; to behave ~ ədəblə/nəzakətlə davranmaq
**correctness** [kə'rektnɪs] n 1. doğruluq, düzgünlük, dəqiqlik, dürüstlük; ~ of the answer cavabın doğruluğu/dəqiqliyi/dürüstlüyü; ~ of the address ünvanın doğruluğu /dəqiqliyi; Correctnees of the address helped us to find the



house easily Ünvanın doğruluğu / dürüstlüyü evi asan tapmaqda bizə kömək etdi; 2. ədəb, nəzakət, əxlaq, ləyaqət
**corrector** [kə'rektəʳ] n korrektor
**correlate[1]** ['kɔrɪleɪt] n korrelyat (məzmunu başqa məfhumla tutuşdurulduqda bəlli olan əlaqədar məfhum); nisbi məfhum; əlaqədar olan bir şey; Smoking and disease of the lungs are thought to be correlates Belə fikirləşirlər ki, ağ ciyərlərin xəstəliyi papiros çəkməklə əlaqədardır
**correlate[2]** [kɔrɪleɪt] v (with, to) münasibətdə olmaq (hər hansı bir), müəyyən bir münasibətə gətirmək; to ~ the history of the 19$^{th}$ century with its literature 19-cu əsrin tarixi ilə onun ədəbiyyatını tutuşdurmaq / müqayisə etmək
**correlation** [.kɔrɪ'leɪʃn] n münasibət, əlaqə, nisbət, qarşılıqlı əlaqə / rabitə; the ~ between unemployment and crime işsizliklə cinayət arasında qarşılıqlı əlaqə; the ~ between climate and crops iqlim və məhsul arasında qarşılıqlı əlaqə; One can easily see the correlation between climate and crops İqlimlə məhsul arasında qarşılıqlı əlaqəni hamı dərk edə bilir
**correlative[1]** [kɔ'relətɪv] n 1. korrelyat (məzmunu başqa məfhum ilə tutuşdurulduqda bəlli olan əlaqədar məfhum); 2. dilç. korrelyat, korrelyat söz və ya ifadə
**correlative[2]** [kɔ'relətɪv] adj korrelyativ, əlaqəsi/münasibəti olan, əlaqəli; ~ words korrelyativ / qoşa sözlər; "Either" and "or" are correlative conjunctions "Either" və "or" korrelyativ / qoşa bağlayıcılardır
**correspond** [.kɔrɪs'pɔnd] v 1. (with, to) uyğun / müvafiq / münasib olmaq; cavab vermək, ödəmək; The house exactly corresponds to my needs Ev mənim ehtiyaclarımı ödəyir; The American Congress corresponds to the British Parliament Amerika Konqresi Britaniya Parlamentinə uyğun gəlir; 2. yazışmaq, bir-birinə məktub yazmaq; John and Bob corresponded for many years before they met Görüşməzdən əvvəl Con və Bob uzun illər yazışdılar/bir-birinə məktub yazdılar; We have not corresponded for some years Biz bir neçə il yazışmadıq / bir-birimizə məktub yazmadıq
**correspondence[1]** [.kɔrɪs'pɔndəns] n 1. uyğunluq, müvafiqlik, mütabiqlik; bərabərlik; very little ~ with reality həqiqətə az uyğunluq; a close ~ between the two accounts iki məlumat arasında yaxın uyğunluq; There is a close correspondence between the two accounts Bu iki məlumat arasında yaxın uyğunluq var; 2. məktub, məktub yazma, yazma, yazışma, korrespondensiya (poçt ilə göndərilən məktublar və s.); diplomatic / commercial ~ diplomatik / ticarət korrespondensiyası; to be in ~ with smb. bir kəslə yazışmaq; to have a great deal of ~ every day hər gün çoxlu korrespondensiya/məktub almaq; to carry on a ~ yazışmaq, yazışma aparmaq; to keep (up) a ~ yazışmanı davam etdirmək; I refused to enter into any correspondence with him about it Bu barədə mən onunla məktublaşmaqdan imtina etdim
**correspondence[2]** [.kɔrɪs'pɔndəns] adj qiyabi; ~ school / courses qiyabi məktəb / kurslar
**correspondent[1]** [.kɔrɪs'pɔndənt] n 1. müxbir, korrespondent; He's a good/bad correspondent O tez-tez / gec-gec yazır; 2. müxbir; sports ~ idman müxbiri; a foreign /war ~ xarici/hərbi müxbir
**correspondent[2]** [.kɔrɪs'pɔndənt] adj müvafiq / uyğun gələn, münasib olan
**corresponding** [.kɔrɪs'pɔndɪŋ] adj 1. müvafiq; ~ period müvafiq dövr / vaxt; Imports in the first three months have increased by 10 per cent compared with the corresponding period last year Keçən ilin müvafiq dövrü ilə müqayisədə birinci üç ayda idxal 10 faiz artıb; 2. yazışma aparan / ilə məşğul olan; ~ bank tic. yazışma aparan bank; 3.: ~ member of a learned society/of an Academy of Sciences elmi cəmiyyətin/Elmlər Akademiyasının müxbir üzvü
**correspondingly** [.kɔrɪs'pɔndɪŋlɪ] adv müvafiq / uyğun olaraq; The new exam is longer and correspondingly more difficult Yeni imtahan daha uzunmüddətlidir və müvafiq olaraq çətindir
**corridor** ['kɔrɪdɔ:ʳ] n 1. koridor (otaqlar arasında uzun yol), aralıq, dəhliz; Room 101 is at the end of the corridor 101-ci otaq koridorun sonundadır; to go along the ~ koridorla getmək; to go down the ~ koridor aşağı getmək; 2. xarici ölkənin ərazisindən keçən sahə / zona
**corrigible** ['kɔrɪdʒəbl] adj düzəldilə / islah oluna biləcək; ~ fault düzəldilə /islah oluna biləcək səhv
**corroborant** [kə'rɔbərənt] adj təsdiq edən, möhkəmləndirən
**corroborate** [kə'rɔbəreɪt] v təsdiq etmək, doğru olduğunu sübut etmək (nəzəriyyənin və s.); The facts corroborate his statement Dəlillər onun bəyanatını təsdiq edir; A person who saw the road accident corroborated the driver's statement Yol hadisəsini görən adam sürücünün ifadəsini təsdiq etdi
**corroborated** [kə'rɔbəreɪtɪd] adj təsdiq edilmiş; a diagnosis ~ by further tests sonrakı testlərlə təsdiq edilmiş diaqnoz; a ~ theory təsdiq edilmiş nəzəriyyə
**corroboration** [kə.rɔbə'reɪʃn] n təsdiq etmə (fikri, məlumatı, inamı və s.); In corroboration of his story he produced a signed statement from his employer Dediyini təsdiq etmək üçün o, sahibkarın imzaladığı xasiyyətnaməni təqdim etdi
**corroborative** [kə'rɔbərətɪv] adj təsdiqləyici, təsdiq edən; möhkəmləndirici
**corrode** [kə'roud] v 1. yemək, korlamaq (pas,

*turşu və s. haq.); Rust corrodes iron Pas dəmiri yeyir / korlayır; The metal has corroded because of rust Pasa görə metal korlanıb;* 2. paslanmaq, pas tutmaq/basmaq

**corrosion** [kə'rouʒən] *n* paslanma, korroziya, turşuma, oksidləşmə

**corrosive** [kə'rousɪv] *adj* yeyici, aşındırıcı, korroziyaya səbəb olan; *Rust and acid are corrosive Pas və turşu aşındırıcıdır / korroziyaya səbəb olandır*

**corrugate** ['kɔrugeɪt] *v* 1. qırışdırmaq, bürüşdürmək; **to ~ the forehead** alnını qırışdırmaq; 2. qırışmaq, bürüşmək; 3. *tex.* büzmək, büzmələmək

**corrugated** ['kɔrugeɪtɪd] *adj* 1. büzülmüş, qırışmış; ozilmiş; **~ paper** əzilmiş kağız; 2. büzməli, büzmələnmiş; dalğalı; **~ iron** dalğalı / büzmələnmiş dəmir

**corrugation** [ˌkɔru'geɪʃn] *n* 1. qırış *(alında)*, büzmə; 2. çuxur, kələ-kötür *(yolda)*

**corrupt**[1] [kə'rʌpt] *adj* 1. xarab olmuş/edilmiş, korlanmış, pozulmuş; əxlaqsız, əxlaqı pozğun, tərbiyəsiz; **~ air** korlanmış hava; **a brutal and ~ regime** qəddar və pozulmuş rejim; **a ~ film full of sex and violence** seks və zorakılıqla dolu əxlaqsız /tərbiyəsiz film; 2. səhvlə dolu; **a ~ manuscript** səhvlə dolu əlyazması; 3. satqın, mənəviyyatca pozğun; **~ officials** satqın məmurlar; 4. korrupsiyaya qurşanmış; **a ~ judge** korrupsiyaya qurşanmış hakim

**corrupt**[2] [kə'rʌpt] *v* 1. korlamaq; korlanmaq; **to ~ the character** xasiyyətini / təbiətini korlamaq; **to ~ morals** əxlaqını / mənəviyyatını korlamaq, yoldan çıxarmaq; **young people whose morals have been ~ed** əxlaqı / mənəviyyatı korlanmış gənclər; 2. rüşvət vermək; *He was sent to prison for trying to corrupt a policeman with money Polisə rüşvət verməyə cəhd göstərdiyinə görə onu həbsxanaya saldılar;* 3. xarab olmaq /etmək; 4. təhrif etmək *(mətni və s.)*

**corruptibility** [kəˌrʌptəbɪlɪtɪ] *n* 1. xarab olmağa meyllilik; puçluq, fanilik; 2. satqınlıq

**corruptible** [kə'rʌptəbl] *adj* 1. xarab ola bilən; xarab olmağa meylli; 2. satqın, pula satılan, rüşvətə meylli; **~ judges** pula satılan / rüşvət alan hakimlər

**corruption** [kə'rʌpʃn] *n* 1. korlama, korlanma; xarab etmə/edilmə/olma; çürümə; **~ of the body** cəsədin/meyitin çürüməsi; **the ~ of a language** dilin korlanması; 2. mənəviyyatca korlanma, əxlaqsızlıq, pozğunluq, əxlaqca pozğunluq; 3. satqınlıq, korrupsiya, korrupsiyaya uğrama; **the ~ of the ancient Roman court** qədim Roma məhkəməsinin korrupsiyaya uğraması; 4. təhrif, təhrif olunma *(mətn və s. haq.);*

**corset** ['kɔ:sɪt] *n* = **corslet**

**corslet** ['kɔ:slɪt] *n* korset *(bədəni düz saxlamaq üçün geyilən enli kəmər)*

**cortegè** [kɔ:'teɪʒ] *n fr.* kortej, təntənəli mərasim

**cortex** ['kɔ:teks] *n (pl* **cortices)** 1. *anat.* beyin qabığı; 2. *bot.* qabıq

**cortices** ['kɔ:tɪsɪ:z] **cortex** *isminin cəmi*

**corvette** [kɔ:'vet] *n dən.* korvet *(üçdorlu qədim hərbi gəmi)*

**coryza** [kə'raɪzə] *n tib.* zökəm, tumov

**cos** [kɔs] *conj.* **because** *sözünün qısa forması; I can't see her at all, cos it's too dark Mən onu əsla görmürəm, çünki çox qaranlıqdır*

**cosh**[1] [kɔʃ] *n (xüs. Britaniyada)* qurğuşunla doldurulmuş ağır dəyənək / kötək

**cosh**[2] [kɔʃ] *v* qurğuşunla doldurulmuş dəyənəklə vurmaq

**cosignatory** ['kou'sɪgnətərɪ] *n* **(to, of)** *hüq* başqa dövlətlərlə müqaviləyə qol çəkən / imza atan şəxs

**cosily** ['kouzɪlɪ] *adv* rahat, rahatca, rahat bir tərzdə, səliqə ilə

**cosine** ['kousaɪn] *n riyaz.* kosinus

**cosiness** ['kouzɪnɪs] *n* rahatlıq, səliqəlilik, əlverişlilik

**cosmetic**[1] [kɔz'metɪk] *n* kosmetik vasitə; **a bag full of ~s** kosmetik vasitələrlə dolu çanta; **the ~s industry** kosmetik vasitələr sənayesi

**cosmetic**[2] [kɔz'metɪk] *adj* kosmetik; **~ surgery** kosmetik cərrahiyyə; **a ~ surgeon** cərrah-kosmetolok

**cosmetical** [kɔz'metɪkəl] *adj* = **cosmetic**

**cosmetically** [kɔz'metɪkəlɪ] *adv* kosmetik olaraq, kosmetik surətdə / cəhətdən

**cosmetician** [ˌkɔzmɪ'tɪʃn] *n* kosmetoloq

**cosmetologist** [ˌkɔzmɪ'tɔlədʒɪst] *n* = **cosmetician**

**cosmetology** [ˌkɔzmɪ'tɔlədʒɪ] *n* kosmetologiya *(üzə, bədənə süni surətdə təravət və gözəllik vermə, bu məqsəd üçün işlədilən maddələr)*

**cosmic** ['kɔzmɪk] *adj* 1. kosmik; **~ flight** kosmik uçuş; **~ research** kosmik tədqiqat, kosmosun öyrənilməsi; **~ radiation** kosmik şüalanma; **~ rays** kosmik şüalar; **~ dust** kosmik toz; **~ fog** *astr.* kosmik duman; 2. nəhəng, çox böyük; **a disaster of ~ proportions** nəhəng /olduqca böyük fəlakət

**cosmodrome** ['kɔzmədroum] *n* kosmodrom

**cosmogony** [kɔz'mɔgənɪ] *n* kosmoqonya *(kainatın, xüsusən dünyanın əmələ gəlməsi haqqında elm)*

**cosmography** [kɔz'mɔgrəfɪ] *n* kosmoqrafiya *(Yerin və göy cisimlərinin quruluşundan bəhs edən elm)*

**cosmology** [kɔz'mɔlədʒɪ] *n* kosmologiya *(kainatın quruluşu haq. ümumi nəzəriyyə)*

**cosmonaut** ['kɔzmənɔ:t] *n* kosmonavt

**cosmonautics** [ˌkɔzmə'nɔ:tɪks] *n* kosmonavtika

**cosmopolitan** [ˌkɔzmə'pɔlɪtən] *n* kosmopolit *(vətənpərvəlik hissini itirərək öz xalqına yad olan və onun mədəniyyətinə xor baxan adam*

**cosmopolitism** [ˌkɔzmə'pɔlɪtɪzm] *n* kosmopolitizm *(bütün dünyanı riyakarcasına özünə vətən*



*hesab edən, milli mədəniyyətə xor baxan və onu inkar edən burjua görüşü)*

**cosmos** ['kɔzmɔs] *n* I kosmos, dünya, aləm, kainat

**cosmos** ['kɔzmɔs] *n* II *bot. (pl* **cosmos** *və* **cosmoses)** kosmos *(sarı, ağ və ya qırmızı rəngli bağ çiçəyi)*

**cosset**[1] ['kɔsɪt] *n* 1. əldə bəslənən quzu; 2. ərköyün uşaq, sevimli, istəkli

**cosset**[2] ['kɔsɪt] *v* əzizləmək, ərköyün böyütmək, nazlamaq, oxşamaq

**cost**[1] [kɔst] *n* 1. qiymət; dəyər; **prime ~** maya dəyəri; **at ~** maya dəyərinə; **free of ~** pulsuz; **the ~ of living** yaşayış minimumu, yaşamaq üçün zəruri olan minimum vəsait; 2. *pl* xərc, çıxar, məxaric, məsarif; **~s of production** istehsal xərcləri; *Their prices are high because production costs are very great Onların qiyməti yüksəkdir, çünki istehsal xərcləri çox böyükdür;* **capital ~s** əsas xərclər; 3. *hüq.* məhkəmə xərcləri; **with ~s** məhkəmə xərclərini prosesdə uduzan tərəfin üzərinə qoymaqla/qoyaraq;

◊ **at great ~ of life** həyat bahasına; **at a heavy ~** çox çətinliklə, ağır zəhmətlə; **at all ~s, at any ~** nəyin bahasına olur olsun; **to know to one's own ~** acı təcrübədən öyrənmək, başına gəldiyi üçün bilmək; *I know to my cost that a broken leg can be very painful Öz təcrübəmdən bilirəm ki, sınmış ayaq çox ağrılı olur;* **to count the ~** bütün şəraiti nəzərə almaq

**cost**[2] [kɔst] *v (pt, pp* **cost)** 1. qiyməti / dəyəri olmaq; oturmaq, başa gəlmək; *Your crime will cost you your life Sənin / Sizin cinayətin / cinayətiniz həyatın / həyatınız bahasına başa gələcək;* **to ~ much / little** baha / ucuz başa gəlmək, baha / ucuz oturmaq; *It cost me a lot of money Bu mənə baha oturdu / başa gəldi;* 2. tələb etmək; *Making a dictionary costs much time and care Lüğət tərtib etmək çox vaxt və diqqət tələb edir;* **to ~ a man his life/health** həyatı/sağlamlığı bahasına başa gəlmək; *It cost him many sleepless nights and anxious moments Bu ona bir çox yuxusuz gecələr və narahat anlar bahasına başa gəldi;* 3. *tic.* qiymətləndirmək, qiymət qoymaq *(mala, əmtəəyə);*

◊ *Cost what it may (be) Nəyin hesabına olur olsun, Nəyin bahasına başa gəlsə də*

**co-star**[1] ['kou'sta:ʳ] *n* kinoda və ya televiziya tamaşasında birgə çıxış edən məşhur aktyor və ya aktrisa; *Her co-star was John Brown Onun tərəf müqabili "ulduz" Con Braun idi*

**co-star**[2] ['kou'sta:ʳ] *v* kinoda baş rolda tərəf müqabil olmaq

**costard** ['kʌstəd] *n* iri / böyük alma

**costard-monger** ['kʌstədˌmʌŋgəʳ] *arx. n* = **coster-monger**

**coster-monger** ['kɔstəˌmʌŋgəʳ] *n* küçədə *(xüs. Londonda)* meyvə, tərəvəz, balıq və s. satan alverçi

**costless** ['kɔstlɪs] *adj* 1. müftə, havayı, pulsuz, heç nəyə dəyməyən, qiymətsiz *(mənfi mənada);* 2. bahalı, qiymətsiz, qiyməti olmayan *(müsbət mənada); It's a costless ring Bu qiymətsiz (yəni çox baha) üzükdür*

**costly** ['kɔstlɪ] *adj* **(-ier, -iest)** baha, bahalı, baha oturan, baha qiymətli; baha başa gələn; **~ furniture** bahalı/baha qiymətli mebel/avadanlıq; **~ victory** baha başa gələn qələbə; **~ mistake** baha oturan səhv; *It would be too costly to repair the car Maşını təmir etmək baha oturacaqdı / başa gələcəkdi*

**costume**[1] ['kɔstju:m] *n* 1. paltar; geyim, kostyum; *Her costume was simple but tasteful Onun geyimi / paltarı sadə, lakin zövqlü idi;* **national ~** milli geyim/paltar; 2. qadın kostyumu; *People wore sixteenth-century costumes for the parade Adamlar parad üçün onaltıncı əsr paltarı geymişdilər;* 3. aktyorların səhnədə geydikləri paltar; **a clown ~** kloun / təlxək paltarı; **actors in policemen's ~s** polis geyimində olan aktyorlar

**costume**[2] ['kɔstju:m] *v* geydirmək *(teatr və ya maskarad kostyumu)*

**costumier** [kɔs'tju:mɪəʳ] *n* kostyumçu *(teatrda kostyumlara baxan adam)*

**cosy** ['kouzɪ] *adj* **(-ier, -iest)** 1. rahat, səliqəli; əlverişli, münasib; **a ~ room / chair** rahat otaq /stul; **a ~ little room** balaca rahat/ səliqəli otaq; *I felt all cosy tucked up in bed Mən yorğanıma bürünüb çarpayıda çox rahatca yatmışdım;* 2. dostcasına, məhrəm; **a ~ chat by the fire** ocağın qırağında dostcasına söhbət

**cot** [kɔt] *n* I 1. balaca ev, daxma; 2. yanları olan uşaq çarpayısı; 3. düşərgə çarpayısı *(ensiz, sada);* 4. xəstəxana çarpayısı; 5. küncə qoyulan ikiadamlıq divan

**cot** [kɔt] *n* II **cotangent** *sözünün qısa forması*

**cotangent** ['kou'tændʒənt] *n riyaz.* kotangens

**cote**[1] [kout] *n* 1. *k.t.* ağıl, xalxal *(mal-qara üçün);* küz *(buzov, quzu, çəpiş üçün);* pəyə; arxac *(davar üçün);* 2. *dial.* koma, daxma, dəyə

**cote**[2] [kout] *v* ağıla/xalxala/pəyəyə salmaq

**coterie** ['koutərɪ] *n* 1. təşkilat, birlik; bir mənafe ətrafında/əsasında birləşmiş adamlar; **a ~ of friends** dostların birliyi / təşkilatı; 2. dərnək; **literary ~** ədəbiyyat dərnəyi; 3. dərnəyin və ya təşkilatın iclası

**cottage**[1] ['kɔtɪdʒ] *n* kottec *(şəhər kənarında birailəlik ev)*, bağ evi; **summer ~** yay istirahət evi

**cottage**[2] ['kɔtɪdʒ] *adj:* **~ cheese** şor; **~ hospital** kənd xəstəxanası; **~ industry** evdə görülən iş *(məs. xalça və s. toxuma);* **~ loaf** kənd çörəyi

**cottager** ['kɔtɪdʒəʳ] *n* 1. kəndli; 2. kottecdə yaşayan; 3. *amer.* bağçı, bağ evində yaşayan

**cotton**[1] ['kɔtn] *n* 1. *bot.* pambıq kolu / bitkisi; 2. pambıq; **~ in seed** təmizlənməmiş / çiyidli pambıq; **long-staple ~** uzunlifli pambıq; **raw ~** xam pambıq; 3. pambıq, vata; 4. pambıq parça; 5. pambıq sap / iplik; 6. iplik parça malları

**cotton**[2] ['kɔtn] *adj* pambıq; pambıq parça; **~ oil** pambıq yağı; **~ manufacture** pambıq parça istehsalı; **~ yarn** pambıq iplik; **a ~ dress** pambıq parçadan tikilmiş paltar; **~ wool** pambıq *(tibbdə işlənən)*; **~ gin** pambıqtəmizləyən *(maşın)*

**cotton**[3] ['kɔtn] *v* **1. (with, together)** yola getmək, arası saz olmaq; *Gradually all cottoned together and plunged into conversation Yavaş-yavaş sıxılma aradan qalxdı və hamı dostcasına söhbətə girişdi;* **2.** uyğun/düz gəlmək; **3. (to)** bağlanmaq, vurulmaq, sevmək; uymaq, aludə olmaq; *I cottoned to him at once Dərhal o mənim xoşuma gəldi; I don't cotton to him O əsla məxoşuma gəlmir / ürəyimə yatmır; He rather cottons to the idea Bu fikir onun xoşuna daha çox gəlir;* **to ~ on** *(asanlıqla)* başa düşmək; *He's been speaking for half an hour before I cottoned on to what he meant Yarım saat danışdıqdan sonra mən onun nə dediyini başa düşdüm;* **to ~ up (to)** dostlaşmağa çalışmaq

**cotton boll** ['kɔtnboul] *n bot.* pambıq qozası

**cotton-cake** ['kɔtnkeɪk] *n* pambıq çiyidindən istehsal edilmiş jmıx

**cotton grass** ['kɔtngra:s] *n bot.* tüklücə

**cotton-mill** ['kɔtnmɪl] *n* iplik fabriki, pambıqəyirən fabrik

**cotton-picker** ['kɔtn.pɪkəʳ] *n* **1.** pambıqyığan; **2.** pambıqyığan maşın

**cotton-plant** ['kɔtnpla:nt] *n bot.* pambıq kolu, pambıq *(bitki)*

**cotton-planter** ['kɔtn.pla:ntəʳ] *n* pambıqçı, pambıq əkən

**cottonseed** ['kɔtnsi:d] *n* pambıq toxumu, çiyid

**cotton-spinner** ['kɔtn.spɪnəʳ] *n* **1.** pambıqəyirən; **2.** pambıqəyirən fabrik sahibi; **3.** pambıqəyirən maşın

**cotton-wood** ['kɔtn'wud] *n bot.* qovaq ağacı

**cotton-wool** ['kɔtn'wul] *n* **1.** pambıq *(məişətdə işlədilən)*; **2.** çiyidli pambıq

**cotton-worm** ['kɔtn'wə:m] *n zool.* pambıq qurdu, sovka

**couch**[1] [kautʃ] *n* **1.** taxt; **2. the ~** psixiatrın *(ruhi xəstələr həkimi)* kabinəsindəki taxt; **3.** psixoanalizlə müalicə; **to put *smb.* on the ~** bir kəs üzərində psixoanaliz aparmaq; **4.** yuva, yataq; daxma, koma, mağara, kaha; **5.** astar, əvvəlcə çəkilən rəng *(rəssamlıqda)*

**couch**[2] [kautʃ] *v* **1.** uzandırmaq, yatırtmaq; *He is couched in slumber O, yuxudadır;* **2.** örtülü /müəmmalı tərzdə ifadə etmək; *The government's refusal was couched in unfriendly language Hökumətin imtina etməsi müəmmalı bir dildə ifadə edilmişdi;* **3.** marığa yatmaq *(heyvan haq.)*; *The cat couched (itself) ready to spring Pişik atılmaq üçün marığa yatmışdı;* **4.** qızıl və ya gümüş sapla tikmək; **5.** *tib.* kataraktanı kəsib götürmək

**couch grass** ['kautʃgra:s] *n* **1.** alaq otu, alaq; **2.** *bot.* sürünən ayrıq *(ot)*

**cougar** ['ku:gəʳ] *n zool.* kuquar, puma *(Amerikada yaşayan vəhşi pişik)*

**cough**[1] [kɔf] *n* öskürək; **to give a slight ~** yüngülcə öskürmək, öskürüb boğazını arıtlamaq; **to have a bad ~** bərk / pis öskürmək;

◊ **churchyard ~** bərk öskürək

**cough**[2] [kɔf] *v* öskürmək; **to ~ down** öskürəklə susmağa məcbur etmək *(natiqi)*; **to ~ out** öskürüb tüpürmək

**cough-drop** ['kɔfdrɔp] *n* öskürək həbi, öskürək əleyhinə həb

**could** [kud] *qüvvətli forma, reduksiya olunmuş forması* [kəd] **can** *felinin keçmiş zaman forması:* **1.** *Sadə məsdərlə işlənərək, şərt budaq cümlələrində real imkan bildirir, məs. He could do it if he wanted İstəsə idi, o bunu edə bilərdi; I could come earlier, if necessary Əgər lazımdırsa, mən bir qədər tez gələ bilərdim; I really couldn't think of it Mən bu barədə heç fikirləşə belə bilmirəm;* **2.** *Perfect məsdərlə işlənərək aşağıdakı mənaları ifadə edir:* **1)** *keçmişdə həyata keçməyən imkan: məs. He could have done it a week ago O bunu keçən həftə edə bilərdi (demək keçmişdə imkandan istifadə edilməmişdir);* **2)** *müəyyən əminsizlik bildirən cümlələrdə (təsdiq cümlələrdə), məs. He could have done it; nobody knows Ola bilsin ki, o bunu edib; heç kəs bilmir;* **3)** *yüksək dərəcədə şübhə (sual və inkar cümlələrdə); Could it be true? Necə yəni? Bu necə ola bilər? She couldn't have said it? Ola bilməz ki, o bunu demiş olsun, O bunu deyə bilməz;* **4)** *nəzakət formasında xahiş; məs. Could you lend me a shilling? Sən / Siz mənə bir şillinq verə bilərdinmi / bilərsinizmi? Could you tell me the right time? Sən / Siz mənə dəqiq vaxtı deyə bilərsənmi/bilərsinizmi?* **3.** *Arzu və meyllilik bildirir; məs. She could cry for shame Xəcalətdən onu yaş boğurdu; I could sing for joy Sevincdən mən oxumaq istəyirdim*

**couldn't** ['kudnt] **could not***un qısa forması*

**coulisse** [ku:'li:s] *n teatr. fr.* kulisa *(səhnədə yan dekorasiyalar)*; **gossip of the ~s** gizli / məxfi / xəlvəti qeybət

**council** ['kaunsl] *n* **1.** şura, sovet; **World Peace Council** Dünya Sülh Şurası; **Security Council** Təhlükəsizlik Şurası; **Council of War** Müharibə Şurası; **city ~** bələdiyyə / şəhər soveti; **to be a member of the city / town ~** şəhər / bələdiyyə şurasının üzvü olmaq; *He is a member of the town/ city council O, şəhər sovetinin / bələdiyyə şurasının üzvüdür;* **2.** məsləhət, müzakirə, məsləhətləşmə; **family ~** ailə məsləhətləşməsi/məsləhəti; **to hold ~** məsləhətə baxmaq/qulaq asmaq; **to be/to meet in ~** məsləhətləşmək, məsləhətə/iclasa yığışmaq; **~ of physicians** həkimlərin məsləhəti, həkim konsiliumu

**council-board** ['kaunslbɔ:d] *n* şura iclası

**council-chamber** ['kaunsl.tʃeɪmbəʳ] *n* = **council-hall**



**council-hall** ['kaunslhɔ:l] *n* şuranın iclas zalı

**councillor** ['kaunsıləʳ] *n* şura üzvü; məsləhətçi

**councilman** ['kaunslmən] *n (pl* **-men** [-mən]) şura üzvü *(xüs. bələdiyyə şurasının)*

**counsel**[1] ['kaunsl] *n* **1.** məsləhət *(xüs. yaşlı adamın, yaxud məsləhətçinin verdiyi)*; **wise ~** ağıllı / müdrik məsləhət; *Listen to the counsel of your elders Böyüklərin məsləhətinə qulaq as / asın;* **to take / to hold ~ with *smb.*** bir kəslə məsləhətləşmək; **to give good ~** yaxşı məsləhət vermək; **2.** müzakirə, müzakirə etmə; **3.** *(cəmdə dəyişmir) hüq.* vəkil, yuriskonsult, hüquq konsultantı, hüquq məsləhətçisi; **King's / Queen's Counsel** kralın / kraliçanın vəkili; **~ for the defendant / the defence** müttəhimin müdafiəçisi / vəkili; **~ for the prosecution** cinayətin ittihamçısı; **~ for the plaintiff** iddiaçının vəkili; **to be heard by ~** işi vəkil vasitəsilə aparmaq; **to take ~'s opinion** vəkillə məsləhətləşmək;

◊ **to keep *one's (own)* ~** gizlətmək *(bir şeyi)*, sirr olaraq saxlamaq; **to take ~ of *one's* pillow** ≅ *Axşamın xeyirindən, səhərin şəri yaxşıdır*

**counsel**[2] ['kaunsl] *v* məsləhət vermək / görmək /bilmək; tövsiyə etmək; **to ~ instant action** dərhal hərəkət etməyi məsləhət görmək; **to ~ *smb.* to leave at once** bir kəsə dərhal / təxirə salmadan getməyi məsləhət görmək; *He counseled us to give up this plan O bizə bu plandan əl çəkməyi məsləhət gördü / bildi*

**counsellor** ['kaunsələʳ] *n* **1.** məsləhətçi, məşvərətçi; **~ of embassy** səfirliyin məsləhətçisi; **2.** vəkil, advokat; **3.** tərbiyəçi, başçı *(xüs. uşaq düşərgəsində)*; **junior ~** tərbiyəçinin/başçının köməkçisi/yardımçısı

**count**[1] [kaunt] *n* I **1.** hesab, hesablama, sayma; haqq-hesab; **to keep ~** hesab aparmaq; **to take ~ of votes** səsləri hesablamaq; **out of ~** saysız-hesabsız, hesabı bilinməyən; **to put *smb.* out of ~** bir kəsi hesabda çaşdırmaq; **2.** diqqət; **to take no ~ of** diqqət verməmək / yetirməmək; **3.** *hüq.* ittihamın / iddianın bəndi; *He was found guilty on all counts O, ittihamın bütün bəndləri üzrə günahkar hesab olundu / edildi;*

◊ **in the final ~** nəticədə, nəticə olaraq

**count** [kaunt] *n* II qraf *(qeyri-ingilis mənşəli)*

**count**[2] [kaunt] *adj* = **countable**

**count**[3] [kaunt] *v* **1.** hesablamaq, saymaq; **to ~ to ten** ona qədər saymaq; *John's only 4, but he can count to 20 Conun cəmi 4 yaşı var, lakin o, 20-yə qədər saya bilir / saymağı bacarır; Count the apples in this box Bu qutudakı almaları say / sayın; Have the votes been counted yet? Səslər artıq sayılıbmı?* **2.** hesab etmək; saymaq; *Jane was counted among the greatest dancers of the century Ceyn əsrin ən böyük rəqqasələrindən biri hesab edilirdi;* **to ~ *smb.* as / for dead** bir kəsi ölmüş bilmək/hesab etmək; **3.** mənası olmaq; *Money counts with him more than anything Onun üçün pul hər şey deməkdir; Every minute counts Hər dəqiqə qiymətlidir;* **4.** *hüq.* işi izah / şərh / bəyan etmək; **to ~ for** mənası / əhəmiyyəti / qiyməti olmaq, məna kəsb etmək; **to ~ for a great deal** (çox) böyük mənası/əhəmiyyəti, böyük əhəmiyyət/məna kəsb etmək; **to ~ for little** böyük mənası / əhəmiyyəti olmamaq; **to ~ for nothing** heç bir mənası/əhəmiyyəti olmamaq; **to ~ off** hesablayıb ayırmaq; **to ~ on** bel bağlamaq, arxayın olmaq; **to ~ on a friend to help** dostun köməyinə bel bağlamaq /arxayın olmaq; **to ~ out** çıxarmaq, kənar / xaric etmək; istisna etmək;

◊ **to ~ heads / noses** iştirak edənləri saymaq; *It is not words that counts but deeds İş sözdə yox, əməldədir;* **to ~ *one's* chickens before they are hatched** ≅ çayı keçməmiş, hop demək, payız gəlməmiş cücə saymaq

**countable**[1] [kauntəbl] *n* sayılan/sayıla bilən isim

**countable**[2] ['kauntəbl] *adj* **1.** sayılan, sayıla bilən; **~ nouns** sayılan/sayıla bilən isimlər

**countdown** ['kauntdaun] *n* əks istiqamətdə sayma *(xüs. idarə olunan raketi buraxmaq üçün)*; *The countdown was stopped with only 7 minutes to go Əks istiqamətdə sayma uçuşa cəmi 7 dəqiqə qalmış dayandırıldı*

**count down** ['kauntdaun] *v* əks istiqamətdə *(yəni hər hansı bir rəqəmdən başlayaraq sıfra doğru)* saymaq *(kosmik aparatları və s. buraxmaq məqamında)*

**countenance**[1] ['kauntınəns] *n* **1.** sifət, üz, üzün ifadəsi; **an expressive ~** ifadəli sifət; **to change *one's* ~** sifətinin ifadəsini dəyişmək; sifətini dəyişdirmək; **to keep *one's* ~** üzünün ifadəsini/sifətini dəyişməmək/saxlamaq; gülməkdən/ağlamaqdan özünü saxlamaq; **2.** soyuqqanlılıq, özünü saxlama, özünü itirməmə, təmkin; **to lose ~** özünü ələ ala bilməmək, özündən çıxmaq, soyuqqanlılığını itirmək; **to put *smb.* out of ~** gözünü zilləməklə bir kəsi çaşdırmaq / hövsələdən çıxarmaq; **3.** mənəvi kömək göstərmə; bəyənmə, təqdir etmə; **to give / to lend ~ to *smb.*** bir kəsə mənəvi kömək göstərmək; **to give / to lend ~ to a plan** planı müdafiə etmək, plana tərəfdar olmaq /çıxmaq

**countenance**[2] ['kauntınəns] v **1.** tərəf olmaq/durmaq; həvəsləndirmək, mənəvi kömək göstərmək; *The peoples of the world will never countenance a war of aggression Dünya xalqları heç vaxt qəsbkarlıq müharibəsini müdafiə etməyəcək;* **2.** bəyənmək; icazə vermək; *Your father won't countenance you / your marrying a foreigner Sənin / Sizin atan / atanız sənin /sizin əcnəbiyə ərə getməyini/getməyinizi bəyənməyəcək*

**counter**[1] ['kauntəʳ] *n* I piştaxta *(mağazada və s.)*; **to sell under the ~** piştaxtanın altından xəlvəti satmaq; *During the war some shopkeepers made a lot of money by selling scarce goods*

*under the counter at high prices Müharibə zamanı bəzi mağaza sahibləri aztapılan malları piştaxta altından baha qiymətə satmaqla çoxlu pul qazandılar;* **over the ~** açıq satış *(xüs. dərman, yəni həkimin resepti olmadan); You can buy medicine to cure your headache over the counter at any shop Sən/Siz istədiyin/istədiyiniz aptekdən başağrısı dərmanı ala bilərsən/bilərsiniz (reseptsiz)*

**counter** ['kauntə^r] *n* II **1.** sayğac *(insan və ya cihaz);* **2.** fişka *(müxtəlif oyunlarda işlənən daş, marka və s.);* **3.** jeton *(metal nişan, marka, medal)*

**counter** ['kauntə^r] *n* III əks-zərbə *(boks yarışında),* əks; **~ revolution** *tex.* əksinə fırlanma

**counter**[2] ['kauntə^r] *v* I qarşı çıxmaq, müqavimət göstərmək; zidd getmək/olmaq; etiraz etmək; *My employer countered my request for more money Mənim sahibkarım mənim məvacibimin artırılması haqqındakı xahişimə etiraz etdi*

**counter** ['kauntə^r] *v* II zərbəni dəf edərək zərbə vurmaq *(boks oyununda)*

**counter**[3] ['kauntə^r] *adv* əks istiqamətdə, əksinə; **to act ~ to** ***smb.'s*** **wishes** bir kəsin arzularının əksinə hərəkət etmək; *He acted counter to my advice O mənim məsləhətimin əleyhinə/ziddinə hərəkət etdi*

**counter-** [-'kauntə^r] *pref. Bu önşəkilçi vasitəsilə feldən əks mənalı sözlər düzəldilir:* **to counter*act*** əks-təsir göstərmək; **to counter*march*** əksinə dönmək, geri qayıtmaq; **counter-*attack*** əks-hücum; **counter*blow*** əks-zərbə və s.

**counteract** [.kauntə'rækt] *v* **1.** mane olmaq, əks-təsir göstərmək; **to ~ *smb.'s* influence** bir kəsin təsirinə mane olmaq / əks-təsir göstərmək; **2.** neytrallaşdırmaq; **to ~ the effect of a poison** zəhərin təsirini neytrallaşdırmaq

**counteraction** [.kauntə'rækʃn] *n* **1.** əks-təsir; müqavimət; **2.** neytrallaşdırma *(məhlulun turşu xassəsini qələvi, qələvi xassəsini isə turşu vasitəsilə yox etmə)*

**counteractive** [.kauntə'ræktıv] *adj* **1.** əks-təsir göstərən; **2.** neytrallaşdıran

**counter-attack**[1] ['kauntərə.tæk] *n* əks-hücum

**counter-attack**[2] [.kauntərə.tæk] *v* əks-hücuma keçmək; *Government forces counter-attacked Hökumət qoşunları əks- hücuma keçdi*

**counter-attacker** ['kauntərətækə^r] *n* əks-hücum edən, əks-hücuma keçən

**counter-attraction** [.kauntərə'trækʃn] *n* **1.** *fiz.* əks-cazibə, əks-cəzbetmə; **2.** yayındırıcı vasitə

**counterblow** ['kauntəblou] *n* **1.** əks-zərbə, cavab zərbəsi; **2.** qarşılıqlı zərbə *(boksda)*

**counter-claim**[1] ['kauntəkleım] *n* qarşılıqlı tələb / iddia

**counter-claim**[2] ['kauntəkleım] *v* qarşılıqlı tələb / iddia irəli sürmək

**counter-clockwise** ['kauntə'klɔkwaız] *adv* saat əqrəbinin əksinə

**counter-espionage** [.kauntər'espıəna:ʒ] *n* əks-kəşfiyyat

**counter-evidence** ['kauntər.evıdəns] *n hüq.* digər sübutları / dəlilləri inkar edən sübut

**counterfeit**[1] ['kauntəfıt] *n* saxtakarlıq etmə; qəlb, saxta; *This ten dollar note is a counterfeit Bu on dollarlıq əsginas saxtadır*

**counterfeit**[2] ['kauntəfıt] *adj* **1.** saxta, qəlp, qondarma, süni; **a ~ coin** saxta sikkə/pul; **2.** yalançı, riyakar, süni, saxta; **~ tears** yalançı göz yaşları

**counterfeit**[3] ['kauntəfıt] *v* **1.** saxtalaşdırmaq, saxtalıq etmək, saxtasını düzəltmək; **to ~ *smb.'s* handwriting / *smb.'s* signature** bir kəsin əlyazmasını/ imzasını saxtalaşdırmaq; **to ~ coin** saxta sikkə kəsmək/zərb etmək; *It is against the law to counterfeit money Saxta sikkə zərb etmək qanuna ziddir;* **2.** aldatmaq, hiylə / riyakarlıq etmək, yalandan özünü ... göstərmək /oxşatmaq/qoymaq; **to ~ sorrow** özünü dərdli göstərmək; **3.** təqlid etmək; **to ~ *smb.'s* voice** bir kəsin səsini təqlid etmək

**counterfeiter** ['kauntəfıtə^r] *n* **1.** saxta/ qəlp pul kəsən; saxtakar, qəlb şey qayıran; **2.** yalançı, adamaldadan, riyakar; **3.** təqlidçi

**counterfoil** ['kauntəfɔıl] *n* kötük *(bilet, qəbz və s. haq.);* talon, pətə

**counter-hitting** ['kauntə.hıtıŋ] *n* əks-zərbə *(boksda)*

**counter-hold** ['kauntəhould] *n* əks-fənd *(güləşdə)*

**counterman** ['kauntəmən] *n (pl* **-men** [-mən]) satıcı, mağaza xidmətçisi

**countermand**[1] [.kauntə'ma:nd] *n* əks-əmr, əvvəlki əmri / sifarişi ləğv etmək üçün əmr / sifariş

**countermand**[2] [.kauntə'ma:nd] *v* **1.** əmri / sifarişi / göstərişi ləğv etmək; **2.** geri çağırmaq *(şəxsi, hərbi hissəni və s.)*

**counter-motion** ['kauntə.mouʃn] *n* **1.**əks-təklif; **2.** əks-hərəkət, əksinə hərəkət

**counter-move** ['kauntəmu:v] *n* əksinə/dala hərəkət

**counter-offensive** ['kauntərə.fensıv] *n hərb.* əks-hücum

**counterpart** ['kauntəpa:t] *n* **1.** həmkar *(eyni vəzifə sahibi); The Minister of Defence is meeting his counterpart in Washington today Bu gün müdafiə naziri Vaşinqtonda öz həmkarı ilə görüşəcək;* **2.** surət; hissə, eyni oxşar olan başqa hissə; **3.** dublikat, surət *(sənədin ikinci nüsxəsi);* **4.** ayrılmaz hissə; **5.** rəqib *(məhkəmə prosesində)*

**counter-petition**[1] ['kauntəpı.tıʃn] *n hüq.* qarşılıqlı iddia

**counter-petition**[2] ['kauntəpı'tıʃn] *v hüq.* qarşılıqlı iddia qaldırmaq

**counterplan** ['kauntəplæn] *n* qarşılıqlı plan; əks-təklif

**counterplot**[1] ['kauntəplɔt] *n* əks-sui-qəsd

**counterplot**[2] [.kauntə'plɔt] *v.* əks-sui-qəsd hazırlamaq



**counterpoise**[1] ['kauntəpɔız] *n* **1.** əks ağırlıq *(ağırlıq qüvvəsini tarazlamaq üçün mexanizmin fırlanan hissəsinin bir ucuna bənd edilən qursa);* **2.** tarazlayıcı qüvvə / təsir və s.; **3.** tarazlıq

**counterpoise**[2] ['kauntəpɔız] *v* tarazlamaq, taraz etmək, tənləşdirmək, bərabərləşdirmək

**counterpoison** ['kauntə.pɔızn] *n* padzəhər; vasitə, çarə, tədbir

**counter-revolution** [.kauntə.revə'lu:ʃn] *n* əksinqilab; **the forces of ~** əksinqilabi qüvvələr

**counter-revolutionary**[1] [.kauntə.revə'lu:ʃnərı] *n* əksinqilabçı

**counter-revolutionary**[2] [.kauntə.revə'lu:ʃnərı] *adj* əksinqilabi; **~ rebellion** əksinqilabı üsyan / qiyam

**countersign**[1] ['kauntəsaın] *n* **1.** *hərb.* şərti cavab siqnalı; buraxılış, parol; **2.** ikinci / əlavə imzalama/ imza; *When you've signed this agreement, it will be countersigned by one of the directors Sən / Siz bu sazişi imzaladıqdan sonra direktorlardan biri də onu əlavə olaraq imzalayacaq*

**countersign**[2] ['kauntəsaın] *v* ikinci / əlavə imza atmaq / qoymaq *(sənədə)*

**counter view** ['kauntəvju:] *n* əks-baxış, əks-nöqteyi-nəzər, əks-fikir

**counter-vote** ['kauntə'vout] *v* **1.** əleyhinə səs vermək; **2.** səs çoxluğu ilə qalib gəlmək

**counterweigh** [.kauntə'weı] *n* əks ağırlıq

**counterwork**[1] ['kauntəwə:k] *n* əks-təsir; müqavimət

**counterwork**[2] ['kauntə'wə:k] *v (pt, pp həm də* **counterwrought)** əks-təsir/müqavimət göstərmək, mane olmaq

**counterwrought** [.kauntə'rɔ:t] **counter-work** *felinin pt, pp forması*

**counting board** [kauntıŋbɔ:d] *n* hesablayıcı komissiya *(seçkidə)*

**counting-house** ['kauntıŋhaus] *n* mühasibat, buxalteriya *(otaq, bina)*

**counting-room** ['kauntıŋru:m] *n amer.* = **counting-house**

**countless** ['kauntlıs] *adj* hədsiz, qədərsiz, saysız, saysız-hesabsız, miqdarsız, miqdarı bilinməyən, saya-hesaba gəlməyən, sayı-hesabı bilinməyən, son dərəcə çox

**country**[1] ['kʌntrı] *n* **1.** ölkə, məmləkət; *Some parts of this country are much warmer than others Bu ölkənin bəzi hissələri digərlərinə nisbətən daha istidir;* **dependant ~** asılı ölkə; **colonial ~** müstəmləkə ölkəsi; **under-developed countries** iqtisadi baxımdan/cəhətdən zəif inkişaf etmiş ölkələr; **Euro-Asian countries** Avrasiya ölkələri; **2.** vətən, yurd, ana yurdu; **our ~** bizim vətənimiz; *After many years abroad he wanted to return home to his country Xaricdə çox illər yaşadıqdan sonra o, evə – öz vətəninə qayıtmaq istədi;* **3.** kənd, kənd yeri; **to go to the ~** kəndə getmək; **to live in the ~** kənddə yaşamaq; *My family like to spend the summer in the country Mənim ailəm yayı kənddə keçirməyi sevir; They want to go to the country tomorrow if the weather is fine Hava yaxşı olsa, onlar sabah kəndə getmək istəyirlər;* **4.** yer, ərazi, məkan; **hilly /sandy/wooded /mountainous ~** təpəlik / qumluq/meşəlik/dağlıq yer; **a mashy ~** bataqlıq yer; **rough ~** kələ-kötür yer/ərazi; **5.** sahə; *This is an unknown country to me Bu mənim üçün tanış olmayan sahədir;*
◊ **to go / to appeal to the ~** parlamenti buraxıb yeni seçki təyin etmək; **to put oneself on *one's* ~** öz seçicilərinə müraciət etmək

**country**[2] ['kʌntrı] *adj* kənd; **~ road** kənd yolu; **~ life** kənd həyatı; **a ~ house** kənd evi; **~ speech** kənd danışıq tərzi, kənd danışığı; **~ council** kənd soveti / şurası; **~ club** kənd klubu; **~ cousin** kənd qohumu

**country-folk** ['kʌntrıfouk] *n top.i (özündən sonra fel təkdə işlənir)* kənd əhli/sakinləri, kədlilər

**countryman** ['kʌntrımən] *n (pl* **-men** [-mən]) **1.** həmyerli, yurddaş, həmvətən; **2.** kənd əhli, kəndli, kənddə yaşayan

**country-people** ['kʌntrı.pı:pl] *n* = **country-folk**

**country-seat** ['kʌntrı'sı:t] *n* malikanə, mülk; bəylik yeri

**country-side** ['kʌntrı'saıd] *n* **1.** kənd yeri; **2.** yerli kənd sakinləri

**country-wide** ['kʌntrı'waıd] *adj* **1.** ümumxalq, ümumi; **2.** hər yerdə/yanda, bütün ölkəni bürüyən

**countrywoman** ['kʌntrı.wumən] *n (pl* **-women** [-wımın]) **1.** həmyerli qadın / qız, həmvətən qadın/qız, yurddaş qadın / qız; **2.** kənd qadını / qızı, kəndli qadını / qızı

**county** ['kauntı] *n* **1.** qraflıq *(İngiltərədə inzibati ərazi bölgüsü);* **home counties** Londonu əhatə edən qraflıqlar; **2.** dairə *(ABŞ-da ərazi bölgü vahidi);* **3.** qrafın mülkü / malikanəsi; qraf; **the ~** qraflığın əhalisi / sakinləri

**county borough** ['kauntı'bʌrə^r] *n* **50000** əhalisi və müstəqil idarəsi olan şəhər

**county council** ['kauntı'kaunsl] *n* bələdiyyə şurası, qraflıq şurası

**county court** ['kauntı'kɔ:t] *n* **1.** qraflıq məhkəməsi *(İngiltərədə);* **2.** dairə məhkəməsi *(ABŞ-da)*

**county family** ['kauntı'fæmılı] *n* yerli zadəganlığa mənsub mülkədar ailəsi

**county-jail** [kauntıdʒeıl] *n* **1.** qraflığın həbsxanası *(İngiltərədə);* **2.** dairə həbsxanası *(ABŞ-da)*

**county prison** ['kauntı'prızn] *n* = **county-jail**

**county seat** ['kauntı'sı:t] *n amer.* dairənin əsas şəhəri

**county town** ['kauntı'taun] *n* qraflığın əsas şəhəri

**coupè** ['ku:peı] *n fr.* **1.** ikiyerli örtülü avtomobil; **2.** *d.y.* ikiyerli kupe *(vaqonun axırında);* **3.** ikiyerli örtülü karet

**couple**[1] ['kʌpl] *n* **1.** cüt, cüt şey; iki; **a ~ of apples** iki / cüt alma; **to work in ~s** iki-iki işləmək; **a ~ of girls** iki qız; **2.** *d.d.* bir neçə; **in a ~ of days**

bir neçə gündən sonra; 3. ər-arvad, bəy və gəlin; **married** ~ ər-arvad; **loving** ~ sevgililər *(oğlan, qız)*; **to go / to hunt, to run in** ~s cüt gəzmək, ayrılmaz olmaq

**couple²** ['kʌpl] *v* 1. birləşdirmək, bağlamaq, qoşmaq *(həm də vaqonu)*; 2. əlaqələndirmək; 3. evlənmək; 4. cütləşdirmək *(heyvan haq.)*

**coupled** ['kʌpld] *adj* 1. bağlanmış, əlaqələndirilmiş, qoşulmuş; 2. *tex.* qoşulmuş, birləşdirilmiş; 3. cütləşdirilmiş *(heyvan haq.)*

**coupler** ['kʌpləʳ] *n* 1. qoşucu, qoşan *(vaqonu bir-birinə və ya parovoza / elektrovoza qoşan dəmir yol işçisi)*; 2. *tex.* mufta *(halqa, bilərzik)*

**couplet** ['kʌplɪt] *n* bir-birinin ardınca gələn, sonu eyni səslə qurtaran iki sətirli şer, məsnəvi

**coupling** ['kʌplɪŋ] *n* 1. birləşdirmə, qoşma; 2. birləşmə *(kosmik gəmilər haq.)*; 3. *tex.* mufta, ilişmə, yapışma

**coupling-rod** ['kʌplɪŋrɔd] *n d.y.* qoşqu dişləci, çillə *(qoşqu aləti)*

**coupon** ['ku:pɔn] *n* 1. kupon *(qiymətli kağızların faiz talonu)*; 2. partiya rəhbərinin partiyanın seçkidə iştirak edəcək namizədə verdiyi zəmanət

**courage** ['kʌrɪdʒ] *n* cəsarət, igidlik, qoçaqlıq, mərdlik, mətanət, qeyrət, hünər, şücaət; **unshaken** ~ sarsılmaz şücaət / mətanət; **to lose** ~ cəsarətini/mətanətini itirmək, qorxmaq; *Don't lose courage! Cəsarətli ol / olun!* **to take / to pluck up** ~ cəsarətlənmək; **to keep up *one's*** ~ ruhdan düşməmək

**courageous** [kə'reɪdʒəs] *n* cəsarətli, mərd, mətanətli, qeyrətli, hünərli, qorxmaz; **a ~ action** cəsarətli hərəkət; **a ~ decision** cəsarətli qərar; *It was courageous of you to try and save the drowning man Sənin /Sizin batan adamı xilas etməyə çalışmağın / çalışmağınız əsl hünər idi*

**courageously** [kə'reɪdʒəslɪ] *adj* cəsarətlə, igidliklə, şücaətlə, hünərlə; **to speak** ~ cəsarətlə / hünərlə danışmaq; *He spoke courageously at the meeting O, iclasda cəsarətlə danışdı*

**courageousness** [kə'reɪdʒəsnɪs] *n* cəsarətlilik, igidlik, şücaətlilik, hünərlilik, qoçaqlıq

**courier** ['kurɪəʳ] *n* 1. kuryer *(idarədə kağız paylayan işçi)*; xidmətçi; 2. səyahətçilərə xidmət edən agent

**course¹** [kɔ:s] *n* 1. yol, səmt, istiqamət; **the ~ of a stream** axının istiqaməti; *The ship is on her right course Gəmi düzgün istiqamət götürüb; Our course was due north Biz şimala istiqamət aldıq;* **to hold/to lay a ~ for** istiqamət almaq/götürmək; 2. axın; **the ~ of a river** çayın axını/istiqaməti; 3. gediş; axın; **the ~ of business** işin gedişi; **the ~ of a disease** xəstəliyin gedişi; **the ~ of events** hadisələrin gedişi; **the ~ of the game** *id.* oyunun gedişi; **the ~ of action** *hərb.* döyüşün/vuruşun gedişi; **in the ~ of** hərəkətdə /prosesdə; *The new railway is in course of construction Yeni dəmir yolu tikilməkdədir;* **in the ~ of a month** bir ay müddətində; *The enemy should be defeated in the course of the year Düşmən bir il müddətinə məhv edilməlidir;* **in due** ~ lazımi qaydada; 4. *id.* cığır; **indoor** ~ örtülü binada cığır; **inner / outside** ~ daxili / xarici cığır; **to keep on the** ~ dairəvi qaçış cığırında getmək *(cıdırda at haq.)*; 5. kurs *(təhsildə, müalicədə və s.)*; **an evening** ~ axşam kursu; **a French** ~ fransız dili kursu; ~ **in the history** tarix kursu; **compulsory/optional /supplementary** ~ icbari/ fakultativ/əlavə kurs; **full-time** ~ tam kurs; **three-year** ~ üçillik kurs; ~ **of training** hazırlıq kursu; ~ **of treatment** müalicə kursu; ~ **of mud baths** palçıq vannası kursu; **to complete a** ~ kurs bitirmək; 6. *pl*: **short-time** ~s qısamüddətli hazırlıq kursları; **preliminary** ~s giriş kursları; **extension** ~ ixtisasartırma kursu; 7. xörək; **dinner of five** ~s beş xörəkdən ibarət nahar; 8.: ~ **of exchange** valyuta kursu;

◊ **a matter of** ~ öz-özünə aydın olan bir şey; **of** ~ əlbəttə, şübhəsiz

**course²** [kɔ:s] *v* 1. ov iti ilə ov etmək *(quş ovu)*; 2. dovşanı qovmaq; 3. var gücü ilə qaçmaq; 4. axmaq; *Tears coursed down her cheeks Onun yanaqlarından yaş axdı*

**courser** [kɔ:səʳ] *n şair.* 1. bərkqaçan/löhrəm at; 2. dovşan dalınca qaçan it

**court¹** [kɔ:t] *n* I məhkəmə; **Supreme Court** Ali Məhkəmə; **Supreme Court of the United States** ABŞ-ın ali məhkəməsi; **International Court of Justice** Beynəlxalq Ədalət Məhkəməsi; **police** ~ polis məhkəməsi; **district** ~ dairə məhkəməsi; **to bring into** ~ məhkəməyə şikayət vermək; **out of** ~ məhkəməsiz; *The case was settled out of court İş məhkəməsiz həll edildi;* **to open the** ~ məhkəmə iclasını açmaq; **in open** ~ açıq məhkəmə iclasında; **to clear the** ~ məhkəmə zalını boşaltmaq *(yəni camaatı məhkəmə gedən otaqdan çıxarmaq)*

**court** [kɔ:t] *n* II 1. saray *(kralın və s.)*; **to hold a** ~ sarayda qəbul təşkil etmək; *The British court is in London Britaniya kral sarayı Londondadır;* 2. saray əhli; *The court moves to the country in the summer Saray əhli yayda kəndə gedir*

**court** [kɔ:t] *n* III *id.* kort *(tennis meydançası)*, meydança; **a tennis** ~ tennis kortu; **indoor** ~ örtülü kort; *They've been on court now for three hours Onlar üç saatdır ki, kortdadırlar (yəni oyunu davam etdirirlər); She knocked the ball right out of the court O, topu vurub kortdan çıxartdı*

**court** [kɔ:t] *n* IV qadınlara pərəstişkarlıq etmə; **to make/to pay ~ to *smb.*** bir kəsə pərəstişkarlıq etmək

**court²** [kɔ:t] *v* 1. pərəstişkarlıq etmək; **to ~ the ladies** xanımlara pərəstişkarlıq etmək; 2. nəvaziş göstərmək, dilə tutmaq, ələ almaq; yaltaqlanmaq, yaltaqlıqla bir şeyə nail olmaq; *Both candidates courted the voters Hər iki namizəd*



*seçiciləri dilə tutdu/ələ almağa çalışdı;* 3. **(to, into, from)** tamahlandırmaq, cəlb etmək, aldatmaq, yoldan çıxartmaq; 4. öz əməlləri/hərəkətləri ilə başına bəla açmaq, risk etmək; **to ~ disaster** öz başına bəla açmaq

**court-dress** ['kɔ:tdres] *n* saray paltarı, saray əyanlarının geydiyi paltar

**courteous** ['kə:tjəs] *adj* nəzakətli, ədəbli, mərifətli, tərbiyəli, qanacaqlı, iltifatlı, lütfkar, gülərüzlü, xoşrəftar; **to be** ~ nəzakətli / lütfkar / ədəbli olmaq

**courteously** ['kə:tjəslɪ] *adv* nəzakətlə, ədəblə, mərifətlə, qanacaqla, iltifatla; **to behave** ~ nəzakətlə / ədəblə davranmaq; *He courteously stood aside to let us pass O, nəzakətlə kənara çəkildi ki, biz keçək*

**courtesan** [ˌkɔ:tɪ'zæn] *n* kurtizanka *(yüngül əxlaqlı qadın)*, xoşu, varlı kişilərlə yaşayan fahişə

**courtesy** ['kə:tɪsɪ] *n* ədəb, nəzakət, mərifət, qanacaq, xoşrəftarlıq, lütfkarlıq, gülərüzlülük; *We were treated with great courtesy Bizimlə çox nəzakətlə/gülərüzlülüklə rəftar etdilər; They didn't even have the courtesy to apologize Onların hətta üzr istəməyə qanacaqları çatmadı; As a matter of courtesy you should tell her you won't be able to attend the meeting Nəzakət xatirinə sən / siz ona iclasa gələ bilməyəcəyini / bilməyəcəyinizi deməli idin / idiniz*

**courtezan** ['kɔ:tɪ'zæn] *n* = **courtesan**

**court-house** ['kɔ:thaus] *n* məhkəmə binası

**courtier** ['kɔ:tjəʳ] *n* 1. saray əhli/adamı; 2. yaltaq

**courtliness** ['kɔ:tlɪnɪs] *n* 1. nəzakətlilik, nəzakət; 2. yaltaqlıq

**courtly** ['kɔ:tlɪ] *adj* 1. nəzakətli, ədəbli, iltifatlı, qanacaqlı; ~ **manners** nəzakətli / qanacaqlı davranış; 2. yaltaq, qulluq göstərən, xoşa gəlməyə çalışan; ~ **language** yaltaq dil

**court-martial¹** ['kɔ:t'ma:ʃəl] *n* hərbi məhkəmə, tribunal

**court-martial²** ['kɔ:t'ma:ʃəl] *v* hərbi məhkəməyə vermək

**court-room** ['kɔ:trum] *n* məhkəmə zalı/ otağı

**courtship** ['kɔ:tʃɪp] *n* 1. pərəstişkarlıq *(qadına)*; 2. erkək heyvanın dişi tərəfi özünə cəzb etmək üçün etdiyi hərəkət *(xüs. quşlarda)*; **the ~ rituals of the peacock / of the turkey** tovuz quşunun/hind toyuğunun cütləşməzdən əvvəl dişilərin diqqətini cəlb etmək üçün etdiyi hərəkət/ritual

**courtyard** ['kɔ:t'ja:d] *n* qalanın / böyük evin / mehmanxananın və s. həyəti

**cousin** ['kʌzn] *n* 1. *(həm də* **first** ~*)* əmioğlu, əmiqızı; dayıoğlu, dayıqızı, xalaqızı, xalaoğlu, bibiqızı, bibioğlu; **second** ~ əmizadə *(qız və oğlan)*; 2. qohum; **to call ~s with *smb.*** bir kəsi qohum hesab etmək; *We are cousins Biz qohumuq;* **a distant** ~ uzaq qohum; *He is a distant cousin of mine O mənim uzaq qohumumdur / qohumlarımdan biridir;*

◊ **forty-second** ~ uzaq qohum; ~ **seven / several times removed** lap uzaq qohum; **Cousin Betty** 1) səy, səfeh, axmaq; 2) *arx.* fahişə, qəhbə

**cove** [kouv] *n* kiçik buxta / körfəz

**covenant¹** ['kʌvɪnənt] *n* 1. müqavilə, razılıq, saziş; 2. müqavilənin / sazişin ayrı-ayrı bəndləri; müqavilənin / sazişin şərti

**covenant²** ['kʌvɪnənt] *v* 1. müqavilə / saziş bağlamaq; 2. müqaviləyə / sazişə görə üzərinə təəhhüd / öhdəlik götürmək

**covenanted** ['kʌvənəntɪd] *adj hüq.* müqavilə /saziş üzrə öhdəlik /təəhhüd götürən

**cover¹** ['kʌvəʳ] *n* 1. qapaq; üz, sarğı; sarıma, bükmə; örtük; çexol; futlyar; qab; **a ~ for a saucepan** qazan qapağı; **a ~ for a chair** stul örtüyü; **glass** ~ şüşə qapaq /örtük /futlyar; 2. zərf, konvert, paket; 3. örtük, pərdə; **under ~ of darkness / of night** qaranlığın / gecənin örtüyü altında; 4. cild; **the ~ of the book** kitabın cildi; **to read a book from ~ to ~** kitabı əvvəldən axıra kimi / qədər oxumaq; 5. sığınacaq, daldalanacaq; **to take** ~ sığınacaq tapmaq, gizlənmək; 6. *id.* müdafiə; 7. pərdə, maska; **under ~ of friendship** dostluq pərdəsi altında; **under ~ of patriotism** vətənpərvərlik pərdəsi altında; 8. meşə örtüyü; 9. *bot.* toxumun qabığı

**cover²** ['kʌvəʳ] *v* 1. örtmək, qapamaq, bağlamaq; **to ~ a saucepan** qazanı örtmək; **to ~ plants with straw** bitkiləri samanla örtmək; **to ~ *one's* head** başını örtmək; 2. himayə etmək, qorumaq; *The warships covered the landing of the army Hərbi gəmilər ordunun sahilə çıxmasını himayə etdi; The father covered his son from the fire with his own body Ata oğlunu oddan öz bədəni ilə qorudu;* 3. gizlətmək, örtmək; **to ~ *one's* face with his hands** üzünü əlləri ilə örtmək; *The enemy were covered from our sight by woods Meşə düşməni bizdən gizlətdi;* **to ~ *one's* shame/confusion/anxiety/mistake** öz utanmağını /xəcalətini /həyəcanını/səhvini gizlətmək; **to ~ (up) *one's* tracks** öz izini itirmək; **to ~ oneself with glory/with shame** özünü şöhrətləndirmək/biabır etmək; 4. **(with)** bulamaq, basmaq; *A passing motor covered me with mud Yanımdan keçən maşın məni palçığa buladı; You are covered with dust Səni / Sizi toz basıb;* 5. üz çəkmək; çəkmək *(kağız və s.)*; **to ~ the seat of a chair with leather** stulun oturacağına dəridən üz çəkmək; **to ~ with wall-paper** divar kağızı çəkmək; 6. basmaq, örtmək; yayılmaq; *Snow covered the ground Qar yeri basmışdı / örtmüşdü; Enemy troops covered the whole country Düşmən qoşunu bütün ölkəyə dolmuşdu; The floods covered a large area Daşqın geniş ərazini basdı;* 7. əhatə etmək; *His researches cover a wide field Onun tədqiqatları bir çox problemləri əhatə edir;* 8. ödəmək, yerini doldurmaq; **to ~ *one's* expenses** xərclə-

rini ödəmək; **to ~ *one's* losses** itkisinin yerini doldurmaq; 9. sığorta etmək; *My policy covers me against loss from fire Mənim əmlakım yanğına qarşı sığortalanıb;* 10. getmək, qət etmək *(məsafəni); He covered the distance in an hour O, məsafəni bir saata getdi/qət etdi; By evening we had covered sixty miles Axşama yaxın biz altmış mil qət etmişdik;* 11. əhatə etmək, nəzərdə tutmaq *(təlimat, müqavilənin bəndi və s. haq.); The rules cover all cases Qanun bütün halları əhatə edir;* 12. kürt yatmaq *(yumurta üstündə);* 13. *hərb.* atəş altında saxlamaq; **to ~ in** torpaq tökmək *(yarığa, deşiyə və s.);* **to ~ in a grave** qəbirə torpaq tökmək; **to ~ over** bağlamaq, örtmək *(üstünü);* **to ~ over a hole in the roof** damda deşiyi örtmək; **to ~ up** 1) bürümək; **to ~ a baby** uşağı bürümək; 2) diqqətlə gizlətmək *(bir kəsin hərəkətini)*

**coverage** [ˈkʌvərɪdʒ] *n* 1. cəlb olunma, əhatə etmə; **a good dictionary with good ~ of American words** amerikan sözlərini əhatə edən yaxşı lüğət; 2. təsir/müşahidə /eşitmə dairəsi *(radio haq.);* 3. reportaj, işıqlandırma, izah etmə *(mətbuat, radio və s. haq.); There is not much coverage of foreign news in the newspaper we get Bizim aldığımız qəzetdə xarici xəbərlər az əhatə olunur*

**covered** [ˈkʌvəd] *adj* 1. örtülü, bağlı; 2. başıörtülü, papaqlı; 3. müdafiə olunmuş / edilmiş

**cover girl** [ˈkʌvəgə:l] *n* şəkli jurnalın cildində çap olunan qız

**covering**[1] [ˈkʌvərɪŋ] *n* örtük; *We always put a covering over our rabbit's cage at night to keep out the cold Biz həmişə ev dovşanımıza soyuq olmasın deyə gecə onun qəfəsinin üstünə örtük salırıq*

**covering**[2] [ˈkʌvərɪŋ] *adj* bərabər göndərilən; qoşma; **a ~ letter** qoşma məktub

**coverlet** [ˈkʌvəlɪt] *n* çarpayı örtüyü, örtük

**covert**[1] [kʌvət] *n* heyvanların *(xüs. çöl heyvanlarının)* gizləndiyi ağaclıq və ya kol-kosluq

**covert**[2] [ˈkʌvət] *adj* gizlin, gizli, oğrun; örtülü; **a ~ reason** gizli /gizlin səbəb; **~ dislike** gizli/gizlin antipatiya; *Their relation became more and more covert Onların əlaqələri getdikcə gizli xarakter aldı*

**covertly** [ˈkʌvətlɪ] *adv* gizlincə, gizlin-gizlin, oğrunca, oğrun-oğrun; **to look ~** gizlin/oğrun-oğrun baxmaq; *The boy looked at the girl covertly Oğlan qıza oğrun-oğrun baxdı*

**covet** [ˈkʌvət] *v* çox istəmək; can atmaq, əldə etməyə çalışmaq *(xüs. özgəyə məxsus olan bir şeyi);* **to ~ *smb.'s* job** başqasının işinə /vəzifəsinə can atmaq, başqasının işini ələ keçirməyə can atmaq; *He had long coveted the chance to work with a famous musician O, məşhur bir musiqiçi ilə işləməyə çoxdan can atırdı*

**covetous** [ˈkʌvɪtəs] *adj* acgöz, tamahkar, doymaz, gözüdoymaz; dargöz; var-dövlətə can atan *(xüs. özgəsinə xas olana);* xəsis, simic; **a ~ look/glance** acgöz baxış; *He has a covetous look Onun acgöz baxışı var*

**covetously** [ˈkʌvɪtəslɪ] *adv* acgözlüklə, tamahkarlıqla; **to look ~** acgözlüklə/tamahkarlıqla baxmaq

**covetousness** [ˈkʌvɪtəsnɪs] *n* acgözlük, tamahkarlıq, gözüdoymazlıq, tamah; xəsislik, simiclik

**cow**[1] [kau] *n zool.* 1. inək; **~ in calf** boğaz inək; **~ in milk** sağılan/sağmal inək; **~ not in milk** sağılmayan/qısır inək; 2. dişi fil / balina / suiti / morj və s.; 3. *kob. jarq.* qadın *(yöndəmsiz, yekəpər);* 4. *amer. jarq.* süd; qaymaq; yağ; mal əti;

◊ **to make ~ eyes** mal kimi baxmaq; *Till the cows come home ≅ Qum göyərəndə, Keçi ağaca çıxanda, Dəvənin boynu düzələndə; You can talk till the cows come home - you'll never make me change my mind Sən / Siz qum göyərənə kimi danışa bilərsən / bilərsiniz, lakin mənim fikrimi dəyişə bilməzsən / bilməzsiniz; God sends a curst cows short horns, Curst cows have cut horns ≅ Vurağan qoça Allah buynuz verməz; The cow knows not what her tail is worth until she has lost it ≅ Ölən inək südlü olar, Sonrakı peşmançılıq fayda verməz*

**cow**[2] [kau] *v* qorxutmaq, qorxuya salmaq

**coward**[1] [ˈkauəd] *n* qorxaq, ağciyər; **to be ~** qorxaq / ağciyər olmaq; *Don't be such a coward! Belə qorxaq olma!/ olmayın!*

**coward**[2] [ˈkauəd] *adj* qorxaq, ağciyər, ürəksiz, cəsarətsiz

**cowardice** [ˈkauədɪs] *n* qorxaqlıq, cəsarətsizlik, ağciyərlik; *He felt ashamed of his cowardice in not coming forward to support his friend O, qorxaqlıq göstərərək irəli çıxıb dostuna kömək etmədiyinə görə xəcalət çəkdi*

**cowardly**[1] [ˈkauədlɪ] *adj* qorxaq, qorxacaq, ürəksiz, cəsarətsiz; ağciyər; **~ conduct** qorxaq / cəsarətsiz davranış

**cowardly**[2] [ˈkauədlɪ] *adv* ürəksiz, qorxaqcasına, qorxa-qorxa, çəkinə-çəkinə

**cowboy** [ˈkaubɔɪ] *n* 1. naxırçı, inək otaran; 2. *amer.* kauboy

**cow college** [ˈkauˈkɔlɪdʒ] *n* 1. kənd təsərrüfat kolleci; 2. aztanınan kiçik kollec

**cower** [ˈkauə] *v* sıxılmaq, yığılmaq, büzüşmək *(soyuqdan),* qısılmaq *(qorxudan)*

**cow-hand** [ˈkauhænd] *n* = **cowboy**

**cow-girl** [ˈkaugə:l] *n amer.* inəyəbaxan qız

**cow-heel** [ˈkauhi:l] *n* xaş

**cowherd** [ˈkauhə:d] *n* naxırçı, malotaran; inəksağan, sağıcı

**cow-hide** [ˈkauhaɪd] *n* 1. inək / öküz gönü; 2. inək gönündən hörülmüş qamçı

**cow-house** [ˈkauhaus] *n* inək damı, pəyə

**cowish** [ˈkauɪʃ] *adj* yavaş, ağır, yöndəmsiz *(hərəkət haq.)*

**cowl** [kaul] *n* keşiş cübbəsi, əba başlıqlı sutana *(katolik ruhanilərin cübbəsi);* başlıq *(cübbədə və s.)*



**cow-leech** [ˈkaulɪ:tʃ] *n d.d.* baytar, mal həkimi

**cowlick** [ˈkaulɪk] *n* kəkil, cıqqa

**cowlike** [ˈkaulaɪk] *adj* inək kimi, inəyəoxşar, inəyəbənzər *(kök qadın haq.)*

**cowman** [ˈkaumən] *n (pl* **-men** [-mən]) 1. *amer.* maldar, çodar; 2. mal ferması işçisi

**co-work** [kouˈwə:k] *v* birgə işləmək, əməkdaşlıq etmək

**cowshed** [ˈkauʃed] *n* pəyə, mal damı

**coxcomb** [ˈkɔkskoum] *n* 1. ədabaz, modabaz, yüngül *(adam),* pijon *(şık geyinən yüngülxasiyyətli gənc);* 2. təlxək papağı

**coxcombical** [ˌkɔksˈkɔmɪkl] *adj* ədabaz, modabaz; özündən razı olan, özünü başqasından üstün/yuxarı tutan, öz nöqsanını görməyən

**coxcombry** [ˈkɔksˌkoumrɪ] *n* ədabazlıq, özünübəyənmə, yüngüllük; təkəbbür, məğrurluq, təkəbbürlük

**coxitis** [kɔkˈsaɪtɪs] *n tib.* koksit *(çanaq-bud oynağının iltihabı)*

**coy** [kɔɪ] *adj* (**-er, -est**) 1. utancaq, təvazökar, ədəbli *(əsas. qadın haq.);* 2. tənha, yalqız, təktənha, xəlvət, uzaq *(yer haq.)*

**coyly** [ˈkɔɪlɪ] *adv* utana-utana, sıxıla-sıxıla, utanaraq, sıxılaraq, təvazökarlıqla, utancaq bir tərzdə

**coyness** [ˈkɔɪnɪs] *n* utancaqlıq, təvazökarlıq

**coyote** [ˈkɔɪout] *n* 1. *zool.* Amerika canavarı; 2. *jarq.* yaramaz, əclaf, alçaq, namərd

**coze** [kouz] *v* dostcasına söhbət etmək

**cozen** [ˈkʌzn] *v* aldatmaq, hiyləgərlik/dələduzluq etmək, adam aldatmaq, tovlamaq, kələk / hiylə gəlmək, başını piyləmək

**cozener** [ˈkʌznə] *n* yalançı, adamaldadan, fırıldaqçı, hiyləgər, dələduz

**crab**[1] [kræb] *n* I 1. krab, yengəc, qısaquyruq *(onayaqlı dəniz xərçəngi);* 2. krab əti

**crab** [kræb] *n* II 1. yabanı turş alma; 2. deyingən / həmişə narazılıq edən adam

**crab**[2] [kræb] *v* (**-bb-**) caynaqları ilə cırmaqlamaq, dalaşmaq *(vəhşi quşlar haq.);*

◊ **to ~ a deal** sazişi / sövdəni pozmaq; **to ~ a turn** aktyorun çıxışını pozmaq; **to ~ *smb.'s* game** bir kəsin oyununu / planını pozmaq

**crabbed** [ˈkræbɪd] *adj* 1. acıqlı, hirsli, narazı; 2. oxunmayan, çətinoxunan *(xətt haq.);* 3. qüsurlu, nöqsanlı, ağır *(dil, üslub haq.)*

**crabbery** [ˈkræbərɪ] *n* krab yetişdirilən yer

**crabbing** [ˈkræbɪŋ] *n* I krab ovu / ovlama

**crabbing** [ˈkræbɪŋ] *n* II yabanı alma yığma / dərmə

**crabby** [ˈkræbɪ] *adj* 1. = **crab-like**; 2. krab bol / çox olan yer

**crab-like** [ˈkræblaɪk] *adj* girintili-çıxıntılı, əyriüyrü, dolanbac; ziqzaq, ziqzaqşəkilli *(hərəkət haq.)*

**crack**[1] [ˈkræk] *n* 1. çat, çatlaq, çatlamış yer; **dangerous ~s in the ice** buzda təhlükəli çatlar/çatlaqlar; *The ground was full of cracks after the hot, dry summer İsti və quraq yaydan sonra torpaqda çatlar əmələ gəlmişdi;* 2. yarıq; *She peeped through a crack in the curtains O, pərdənin arasındakı yarıqdan baxdı;* 3. qəfil kəskin səs; **the ~ of a pistol shot** qəfil tapança atəşinin səsi; **a loud ~ of thunder** göy gurultusunun səsi, göy gurultusu; 4. səsi eşidilən qəfil zərbə; **to give *smb.* a ~ on the head** bir kəsin başına qəfil zərbə endirmək; 5. bir az açma; **to open the window a ~** pəncərəni bir az açmaq; *Open the door a crack Qapını bir az aç / açın!*

◊ **in a ~** bir anda, göz açıb yumunca, göz qırpınca; **at the ~ of dawn** dan yeri çatlayanda / ağaranda *(yəni səhər çox erkən);* **to get up at the ~ of dawn** dan yeri çatlayanda / ağaranda durmaq; **the ~ of doom** *din.* qiyamət gününün çatdığını xəbər verən suri-İsrafil *(dini etiqada görə guya qiyamət günü çalınacaq şeypurun səsi);* **to / till the ~ of doom** nəhayətsiz, qiyamət/məhşər gününə qədər *(heç bir vaxt olmayacaq, baş tutmayacaq şey mənasında)*

**crack**[2] [kræk] *adj d.d.* calallı, dəbdəbəli; təmtəraqlı, parlaq; çox gözəl; birinci dərəcəli / ən əla; məşhur, şöhrətli; **a ~ shot** əla atıcı; *He's a crack shot O, əla/birinci dərəcəli atıcıdır;* **~ team** birinci dərəcəli komanda; **~ unit** *hərb.* seçilmiş hissə

**crack**[3] [kræk] *v* 1. çatlamaq, çatlatmaq; *The ice cracked as I stepped into it Mən buzun üstünə çıxarkən o çatladı; Boiling water will crack a glass Qaynayan su şüşəni çatladar; You can crack this toughened glass but you can't break it Sən/Siz bu elastikləşdirilmiş şüşəni çatlada bilərsən/ bilərsiniz, amma onu sındıra bilməzsən / bilməzsiniz; She has cracked a bone in her arm Onun qolunun sümüyü çatlamışdır;* 2. sındırmaq, qırmaq; **to ~ a nut** fındıq sındırmaq / qırmaq; **to ~ a safe** seyfi sındırmaq; 3. açılmaq, gurlamaq *(silah haq.); The hunter's rifle cracked and the deer fell dead Ovçunun tüfəngi açıldı / gurladı və ceyran yerə yıxıldı;* 4. şaqqıldatmaq; **to ~ a whip** qamçını şaqqıldatmaq; **to ~ the joints of the fingers** barmağını şaqqıldatmaq; 5. çırtıldamaq; *The damp wood cracked in the fire Yaş odun ocaqda çırtıldayırdı;* 6. *dial. amer.* naqqallıq/boşboğazlıq etmək, çənə /laqqırtı vurmaq, çərənləmək, dil boğaza qoymamaq; qeybət etmək, dedi-qodu ilə məşğul olmaq; 7. özünü öymək/tərifləmək, lovğalanmaq, öyünmək;

◊ **to ~ a bottle** butulkanı içib boşaltmaq; **to ~ a smile** gülümsəmək; **to ~ a record** *amer. id.* rekord vurmaq/qazanmaq; rekordu təzələmək; **a hard nut to ~** 1) çətin / həllolunmaz problem / məsələ; 2) çətin/yolagəlməz adam; *He is a hard nut to crack O, çətin/yolagəlməz adamdır*

**crack-brain** [ˈkrækbreɪn] *n d.d.* dəli, ruhi xəstə; qeyri-normal, normal olmayan *(adam)*

**crack-brained** [ˈkrækˈbreɪnd] *adj d.d.* 1. kəmağıl,

ağlı zəif; dəli, ruhi xəstə; 2. mənasız, boş, əbəs, bihudə; 3. ağılsız, düşüncəsiz; lazımınca düşünülməmiş / götür-qoy edilməmiş; çox axmaq; **a ~ idea** boş / axmaq fikir; **a ~ plan** lazımınca düşünülməmiş / götür-qoy edilməmiş plan

**cracked** ['krækt] *adj* 1. çatlamış; çatlaq; **~ cup** çatlamış /çatlaq fincan; **~ plate** çatlamış /çatlaq boşqab; **~ walls** çatlamış / çatlaq divarlar; *Her lips were dry and cracked Onun dodaqları quru və çatlaq idi;* 2. ağılsız, gic, sarsaq; *I think he's a bit cracked, don't you? Məncə, o, bir az/balaca gicdir, sən/siz nə fikirdəsən/fikirdəsiniz?* 3. titrək, kəskin *(səs haq.);* 4. korlanmış; sarsılmış *(inam, şöhrət, ad və s. haq.)*

**cracker** ['krækəʳ] *n* 1. fındıqsındıran, qozsındıran; 2. kreker *(nazik quru peçenye);* 3. *d.d.* lovğa, gopçu, özünü öyən; 4. zərbə; qəza; 5. *tex.* daşdoğrayan maşın

**crackers** ['krækəz] *adj* dəli, gic; ağılsız; *That noise is driving me crackers Bu səs məni dəli / gic edir*

**crack-headed** ['kræk'hedıd] *adj* = **crack-brained**

**crackjaw** ['krækdʒɔ:] *adj d.d.* çənəsındıran, çətin tələffüz edilən/tələffüz olunan *(səs haq.)*

**crackle[1]** ['krækl] *n* yarılma *(odun);* çatlama; xırtıltı, xışıltı; çırtıltı; **the ~ of the burning twigs** yanan çırpıların çırtıltısı

**crackle[2]** ['krækl] *v* çatlamaq, çırtıldamaq; xırçıldamaq; *The snow crackled under our feet as we walked Biz yeridikcə qar ayaqlarımızın altında xırtıldayırdı; The fire crackled Ocaq çırtıldayırdı*

**crackling** ['kræklıŋ] *n* 1. cartıldama; catırtı, şaqqıltı; çatırtı-patırtı; xırtıltı, xışıltı; cırıltı; **the ~ of the fire** ocağın çırtıltısı; *It was a crackling in the bush and suddenly a large bird appeared Kolda bir xışıltı vardı və qəflətən iri bir quş peyda oldu;* 2. qızarmış qabıq *(donuz ətində);* 3. *pl* cızdaq

**cracknel** ['kræknl] *n* 1. quru peçenye; 2. *pl* cızdaq

**crackpot[1]** ['krækpɔt] *n* dəli, gic, səy, səfeh; *He's a complete crackpot O tamamilə gicdir / səfehdir*

**crackpot[2]** ['krækpɔt] *adj* qəribə, sərsəri, gic; **a ~ scientist** qəribə / sərsəri alim

**crack-rope** ['krækroup] *n* 1. dar ağacından asılmış adam; 2. dar ağacından asılmağa layiq adam

**crack-skull** ['krækskʌl] *n* = **crack-brain**

**cracksman** ['kræksmən] *n* (*pl* **-men** [-mən]) evyaran oğru

**cracky** ['krækı] *adj* 1. çatlamış; 2. tez çatlayan, tez çatlaya bilən; 3. *d.d.* dəli, gic, anormal, səfeh

**-cracy** [-krəsı] *suf. mürəkkəb sözlərin komponenti; Azərbaycan türkcəsində* **-kratiya** *şəkilçisinə uyğun gəlir:* ***demo*cracy** demo**kratiya**, ***bureau*cracy** büro**kratiya**

**cradle[1]** ['kreıdl] *n* 1. beşik, nənni; *She rocked the baby to sleep in its cradle O, uşağı yırğaladı ki, beşiyində yatsın;* **from the ~** anadangəlmə; **orator from the ~** anadangəlmə natiq / orator; 2. bir şeyin yarandığı məkan/beşik; **the ~ of the literature and art** ədəbiyyat və incəsənətin beşiyi / yarandığı məkan; *Greece was the cradle of Western civilization Yunanıstan qərb mədəniyyətinin beşiyi olmuşdur;* 3. telefonun oturacağı; *He put the receiver into its cradle O, dəstəyi telefonun oturacağına qoydu;* 4. *tex.* dayaq, çərçivə;
◊ **from the ~ to the grave** beşikdən qəbirə kimi, ömür boyu

**cradle[2]** ['kreıdl] *v* 1. beşiyi yırğalamaq, layla çalmaq, layla çalıb yatırtmaq; **to ~ a child in *one's* arms** uşağa qollar üstə layla çalmaq; *John cradled the child in his arms Con uşağa qolları üstündə layla çaldı;* 2. uşaqlıqdan tərbiyə etmək; **to be ~d in luxury** dəbdəbə/təmtəraq içərisində böyümək; 3. yumaq *(qızıllı torpağı)*

**craft** [kra:ft] *n* I 1. sənət, peşə; iş; **the jeweller's ~** zərgərlik sənəti/peşəsi; 2. bacarıq, qabiliyyət, məharət; zirəklik, çeviklik; ustalıq; 3. biclik, yalan, hiylə, məkr, kələk, tülkülük; **to get *smth.* by ~** bir şeyi bicliklə / hiylə ilə / kələklə əldə etmək; 4. ittifaq; sex; **the ~ of masons** bənnaların ittifaqı

**craft** [kra:ft] *n* II qayıq *(xüs. kiçik); The harbour was full of sailing craft Liman üzən kiçik qayıqlarla dolu idi*

**-craft** [kra:ft] *suf. Mürəkkəb sözlərin tərkib hissəsidir.* ***handi*craft** sənət, peşə; ***witch*craft** cadugərlik, ovsunçuluq, sehrbazlıq; ***stage*craft** səhnə ustalığı *və s.*

**craftbrother** ['kra:ft.brʌðəʳ] *n* sənət / peşə yoldaşı

**craftily** ['kra:ftılı] *adv* cəld, bacarıqla, məharətlə; bicliklə, kələklə

**craftiness** ['kra:ftınıs] *n* biclik, məkrlilik, hiyləgərlik, məkr, hiylə; bacarıq, ustalıq

**craftsman** ['kra:ftsmən] *n* (*pl* **-men** [-mən]) 1. peşəkar, sənətkar; 2. mahir/qabil/məharətli / bacarıqlı usta; 3. rəssam, yazıçı

**craftsmanship** ['kra:ftsmənʃıp] *n* ustalıq, sənətkarlıq, məharət, zərif/məharətlə görülmüş iş

**craftsmaster** ['kra:fts.ma:stəʳ] *n* 1. mahir / qabil / məharətli usta; 2. ekspert, yaxşı bilən, bələd

**crafty** ['kra:ftı] *adj* (**-ier, -iest**) 1. bic, hiyləgər, kələkbaz, fəndgir, xain, məkrli, şeytan, iblis; **~ politician** bic/hiyləgər/kələkbaz / fəndgir siyasətçi; *He is as crafty as a fox O, tülkü kimi bicdir/hiyləgərdir;* 2. *d.d.* cəld, diribaş, zirək, çevik, mahir, bacarıqlı

**craftily** ['kra:ftılı] *adv* bicliklə, hiyləgərliklə, kələkbazlıqla, fəndgirliklə, iblis / şeytan kimi

**crag** [kræg] *n* qaya, sıldırım qaya, sıldırım

**craggy** ['krægı] *adj* 1. qayalı, sıldırımlı; **a ~ coastline** qayalı/ sıldırımlı dəniz sahili; 2. cod, görkəmcə kobud; **his ~ face** onun cod/görkəmcə kobud sifəti; *I was attracted by Abraham Lincoln's craggy face Abraham Linkolnun cod sifəti məni cəzb etdi*



**cragsman** ['krægzmən] *n* (*pl* **-men** [-mən]) alpinist

**crake[1]** [kreık] *n zool.* çəkçəki *(quş)*

**crake[2]** [kreık] *v* xoşagəlməyən cingiltili səs çıxartmaq

**cram[1]** [kræm] *n d.d.* 1. basabas, basırıq, tünlük; 2. əzbərləmə; əzbərçilik; 3. = **crammer**; 4. yalan, uydurma; aldatma, fırıldaq; **to tell a ~** yalan demək / danışmaq

**cram[2]** [kræm] *v* (**-mm-**) 1. doldurmaq, çox/ ağzınacan doldurmaq; *The hall was crammed Zal ağzına qədər dolu idi/dolmuşdu; Don't cram your bag too full of clothes Çantanı paltarla çox doldurma/doldurmayın;* **to ~ people into a railway carriage** adamları sərnişin vaqonuna doldurmaq; *The car was crammed full Maşın ağzına kimi dolu idi;* 2. basmaq, basışdırmaq, tıxamaq; **to ~ food into *one's* mouth** yeməyi ağzına basmaq/tıxamaq; **to ~ papers into a drawer** qəzetləri siyirtməyə basışdırmaq; **to be ~ed with** dolu olmaq; *The streets were crammed with people waving flags Küçələr əllərində bayraq yelləyən adamlarla dolu idi;* 3. tələsik əzbərləmək; **to ~ *(up)* history *(for)* an examination** tarixi imtahan üçün əzbərləmək/əzbərdən öyrənmək; 4. yemləmək, doyana qədər yedirtmək *(quşu);* 5. aldatmaq, yalan danışmaq; *You are cramming Sən/Siz yalan danışırsan/danışırsınız, Sən /Siz gopa basırsan /basırsınız;*
◊ **to ~ *smth.* down *smb.'s* throat** bir şeyi bir kəsə zorla qəbul etdirmək *(öz fikrini, baxışını və s.)*

**crammed-full** ['kræmd'ful] *adj* ağzına qədər dolu

**crammer** ['kræməʳ] *n* 1. repetitor, məşqçi, öyrədən *(zəif şagirdi evdə hazırlayan müəllim);* 2. əzbərçi *(dərsini anlamadan əzbərləyən şagird)*

**cramp[1]** [kræmp] *n* I qıc, cəng; qıc/cəng olma; tutulma; spazma; **~ in the calf muscles** *tib.* baldır əzələlərinin qıc olması

**cramp** [kræmp] *n* II 1. *tex.* sıxac, çənbər, dəmir bənd, pərçim; 2. əngəl, maneə, ilişik; 3. əyrilik, çəplik

**cramp[2]** [kræmp] *adj* 1. ensiz, dar, sıx; məhdud; 2. aydın olmayan, anlaşılmaz, başa düşülməsi çətin olan; qəribə; **~ reason** qəribə/anlaşılmaz səbəb; **~ hand** başa düşülməsi çətin olan / anlaşılmaz xətt

**cramp[3]** [kræmp] *v* sıxmaq, sıxışdırmaq, mane olmaq; məhdudlaşdırmaq *(inkişafı, hərəkəti və s.); All these things cramped his progress Bu şeylərin hamısı onun müvəffəqiyyət qazanmasına mane oldu*

**cramped** [kræmpt] *adj* I qıc olmuş

**cramped** [kræmpt] *adj* II 1. sıxılmış, basılmış, doldurulmuş, qısılmış; sıxıntılı; dar, darısqal; **a ~ little flat** balaca dar/darısqal mənzil; 2. sıx oxunmaz, aydın olmayan *(əlyazması haq.);* **~ writing** sıx yazı/əlyazması; *Cramped writing is difficult to read Sıx xətti/ əlyazmasını oxumaq çətindir;* 3. dardüşüncəli, darfikirli, məhdud *(adam haq.)*

**cranberry** ['krænbərı] *n bot.* mərcanı, quşüzümü

**crane[1]** [kreın] *n* 1. *zool.* durna; 2. *tex.* kran *(yükqaldıran);* 3. *tex.* sifon *(parovoz ocağında hava cərəyanını gücləndirmək üçün cihaz)*

**crane[2]** [kreın] *adj:* **~ attendant** krançı *(kranda işləyən fəhlə);* **~ truck** avtokran

**crane[3]** [kreın] *v* 1. uzatmaq *(boynunu);* **to ~ the neck** boynunu uzatmaq *(yaxşı görmək üçün);* 2. kranla yük qaldırmaq; 3. *d.d.* tərəddüd etmək, çətinlik qarşısında geri çəkilmək

**crane-fly** ['kreınflaı] *n zool.* uzunayaq

**crania** ['kreınjə] **cranium** *isminin cəmi*

**cranial** ['kreınjəl] *adj anat.* beyin; **~ cavity** beyin boşluğu; **~ nerve** kəllə-beyin əsəbi; **~ roof** beyin qapağı

**craniology** [.kreını'ɔlədʒı] *n anat.* kraniologiya *(antropologiyada kəllənin quruluşunu tədqiq edən bəhs)*

**craniometry** [.kreını'ɔmıtrı] *n* kraniometriya *(kəllənin ölçülməsi)*

**cranium** ['kreınjəm] *n anat.* kəllə, qafa tası

**crank[1]** [kræŋk] *n* 1. şıltaq, şıltaqlıq, qəribəlik, ədabazlıq, naz, kef; tərslik; 2. qəribə/əcaib adam; 3. manyak, düşkün *(maniya xəstəliyinə tutulmuş adam)*

**crank[2]** [kræŋk] *adj* 1. laxlamış, laxladılmış, boşalmış, boşaldılmış *(mexanizm və s. haq.);* 2. zəif *(sağlamlıq haq.);* 3. *dən.* ləngər vuran, tez çevrilən *(gəmi haq.)*

**crank[3]** [kræŋk] *v* kəskin qulaqbatıran səs çıxarmaq

**crank-case** ['kræŋkkeıs] *n tex.* karter *(1) mexanizmi zədələnməkdən və tozdan qorumaq üçün qurğu; 2) içində mexanizm yerləşən metal qutu)*

**cranked** ['kræŋkt] *adj tex.* dirsəkli, buğum-buğum; əyri, bükük, bükülmüş

**crankle[1]** ['kræŋkl] *n* dirsək; bükük; ziqzaq, döngə

**crankle[2]** ['kræŋkl] *v* burulmaq, qıvrılmaq, əyilmək, bükülmək

**crank-shaft** ['kræŋkʃa:ft] *n tex.* dirsəkli val

**cranky** ['kræŋkı] *adj* (**-ier, iest-**) 1. laxlamış, laxladılmış, korlanmış *(mexanizm haq.);* 2. acıqlandırılmış, hirsləndirilmiş, əsəbiləşdirilmiş; qıcıqlandırılmış; 3. şıltaqçı, şıltaq; qəribə, əcaib; 4. *dial.* zəif *(səhhət haq.)*

**cranny** ['krænı] *n* çat, çatlaq, yarıq, çatlamış yer; **a mouse hiding in a ~ in the stone wall** daş divarın yarığında gizlənən siçan

**crap[1]** [kræp] *n* 1. zir-zibil; *Clear all this crap off the table Bütün bu zir-zibili stoldan yığışdır /yığışdırın;* 2. mənasızlıq; cəfəngiyyat; *His*

*speech was just a load of crap Onun nitqi cəfəngiyyatla dolu idi;* 3. *tab.* nəcis; **to have a ~** çölə çıxmaq, nəcis ifraz etmək

**crap[2]** [kræp] *v tab.* nəcis ifraz etmək

**crape** [kreɪp] *n* krep *(1) qara rəngli zərif, nazik qırış-qırış parça; 2) matəm əlaməti olaraq bu parçadan olan sarğı)*

**crappy** ['kræpɪ] *adj* pis, əhəmiyyətsiz, yararsız, heç nəyə yaramayan; **a ~ book / programme** yararsız kitab / proqram; **a ~ dance** pis rəqs

**craps** [kræps] *n (Özündən sonra fel təkdə işlənir)* zərlə oynanılan qumar oyunu

**crapulence** ['kræpjuləns] *n* 1. bərk sərxoşluqdan sonra süstləşmə / özünü pis hiss etmə; 2. sərxoşluq, əyyaşlıq, həddən artıq içkiyə qurşanma; eyş-işrət

**crapulent** ['kræpjulənt] *adj* 1. sərxoşluğa, acgözlüyə və s. meylli; 2. bərk sərxoşluqdan sonra süst vəziyyətdə olan

**crash[1]** [kræʃ] *n* 1. gurultu, partıltı, xarıltı, şaqqıltı, gumbultu; səs-küy; **the ~ of breaking glass** sınan şüşənin şaqqıltısı; *The tree fell with a loud crash Ağac gurultu/şaqqıltı ilə yıxıldı;* **a ~ of thunder** ildırım gurultusu/ şaqqıltısı; **~ of artillery** topların gurultusu; 2. sınma, sındırma; qəza, avariya *(xüs. təyyarənin); All the passengers were killed in the train/ plane /car crash Bütün sərnişinlər dəmiryol/təyyarə/avtomobil qəzasında həlak oldular;* 3. iflas, müflislik, bankrotluq

**crash[2]** [kræʃ] *v* 1. düşmək, tökülmək, uçulmaq, sökülmək, dağılmaq, gurultu ilə dağılmaq; *The dishes crashed to the floor Qab-qacaq şaqqıltı ilə yerə/döşəməyə töküldü;* 2. qəzaya uğramaq; *The car crashed on the bend Maşın döngədə qəzaya uğradı;* 3. gurlamaq, şaqqıldamaq; *The lightning flashed and thunder crashed Şimşək çaxdı və göy / ildırım gurladı;* 4. iflasa uğramaq, iflas etmək; *The New York stock exchange crashed in 1929 Nyu York birjası 1929-cu ildə iflasa uğradı;* 5. sınmaq, qırılmaq; *The vase crashed as it struck the floor Döşəməyə dəyən kimi vaza sındı;* **to ~ into** soxulmaq *(içəri);* **to ~ into the defence** *hərb. d.d.* müdafiəni yarmaq; ◊ **to ~ the gate** *amer.* 1) çağırılmadan / dəvət almadan / olunmadan gəlmək; 2) biletsiz keçmək/girmək *(teatra, kinoya, konsertə və s.)*

**crash-ambulance** ['kræʃ'æmbjuləns] *n* növbətçi təcili yardım maşını *(təyyarə meydanında)*

**crash-helmet** [kræʃ.helmɪt] *n* qoruyucu şlem /dəbilqə

**crash-land** ['kræʃlænd] *v av.* 1. məcburi yerə enmək; 2. yerə enərkən qəzaya uğramaq

**crash-landing** ['kræʃ.lændɪŋ] *n av.* məcburi yerə enmə/oturma

**crass** [kræs] *adj* 1. tam, büsbütün, tamamilə; **~ stupidity** tam/büsbütün axmaqlıq; **~ ignorance** tam avamlıq/cahillik; 2. çox gic/axmaq; **~ questions** çox axmaq/ gic suallar

**crassly** ['kræslɪ] *adv* gic, gic-gic, axmaq, səfeh, ağılsız; **to speak ~** gic / gic-gic danışmaq

**crassness** ['kræsnɪs] *n* giclik, axmaqlıq, səfehlik

**-crat** [-kræt] *mürəkkəb sözlərin tərkib hissəsi; Azərbaycan türkcəsində* **-krat** *komponentinə müvafiq gəlir:* ***bureaucrat*** bürokrat, ***plutocrat*** plutokrat *(öz varı və dövləti sayəsində nüfuz və hakimiyyətə sahib olan adam)*

**crate** [kreɪt] *n* 1. mal daşımaq üçün iri taxta konteyner; 2. butulka yığmaq üçün metaldan və ya plastikdən hazırlanmış və kiçik hissələrə ayrılmış qab/qutu, kletka; **a ~ of milk** bir kletka süd; **a ~ of wine** bir kletka şərab

**cravat** [krə'væt] *n d.d.* qalstuk; boynuna bağlanan yaylıq *(kişilər üçün)*

**crave** [kreɪv] *v* 1. **(for)** susamaq; həsrət çəkmək, həsrətində olmaq, çox arzu etmək; *Sometimes I crave for a piece of chocolate Bəzən mən bir parça şokoladın həsrətini çəkirəm / həsrətində oluram;* 2. ürəkdən istəmək, ürəkdən xahiş etmək; **to ~ *smb.'s* forgiveness** bir kəsdən bağışlanılmasını ürəkdən istəmək

**craven[1]** ['kreɪvən] *n* qorxaq, ağciyər, ürəksiz / cəsarətsiz / qorxaq adam

**craven[2]** ['kreɪvən] *adj* qorxaq, qorxacaq, ürəksiz, cəsarətsiz, ağciyər

**craving** ['kreɪvɪŋ] *n* 1. qızğın istək / arzu, cəhd, can atma, meyl; 2. qızğın yalvarış

**crawfish[1]** ['krɔ:fɪʃ] *n zool.* çay və ya göl xərçəngi

**crawfish[2]** ['krɔ:fɪʃ] *v* 1. *amer. d.d.* xərçəng kimi geri-geri/daldalı getmək; 2. yayınmaq, özünü yana / kənara çəkmək, geri çəkilmək *(bir şeydən)*

**crawl[1]** [krɔ:l] *n* 1. sürünmə; iməkləmə; **traffic moving at a ~** çox yavaş gedən nəqliyyat; 2. yavaş hərəkət; **to go at a ~** yavaş getmək/hərəkət etmək; 3. yaltaqlıq, quyruq bulama, köləcəsinə səcdə / sitayiş; 4. *id.* üzmə üslubu "krol" *(ən iti üzmə üsulu);* **back/front ~** arxası /üzüüstə krol; **rolling ~** dolama krol

**crawl[2]** [krɔ:l] *v* 1. sürünmək; iməkləmək; *The baby crawled across the room Uşaq otağın bu başından o başına iməklədi;* 2. yavaş-yavaş getmək/yerimək; *There's an insect crawling up your back Sənin / Sizin kürəyində /kürəyinizdə bir həşərat yeriyir; Our train crawled over the bridge Bizim qatar körpünün üstündən yavaş-yavaş gedirdi;* 3. yaltaqlanmaq, yaltaqlıq etmək, quyruq bulamaq, alçalmaq; *I don't like crawling to my boss Mən müdirimə quyruq bulamağı xoşlamıram*

**crayfish** ['kreɪfɪʃ] *n* = **crawfish[1]**

**crayon[1]** ['kreɪən] *n* rəngli karandaş/tabaşir; **a blue ~** mavi rəngli tabaşir / karandaş

**crayon[2]** ['kreɪən] *v* rəngli karandaşla/tabaşirlə çəkmək *(xətt və s.)*

**craze[1]** [kreɪz] *n* 1. maniya *(bir şeyə, fikrə həddindən artıq mübtəla olmaqdan ibarət ruhi xəstəlik);* 2. ən geniş yayılmış dəb/ moda; həvəs, maraq; **a ~ for stamp-collecting** marka toplamaq həvəsi/ marağı; *High boots are the latest craze Hündür / Uzunboğaz çəkmə ən son modadır*



**craze[2]** [kreɪz] *v* 1. ağlını başından almaq, dəli etmək; dəli olmaq; 2. nazik çat əmələ gətirmək *(fincanda, boşqabda və s.)*

**crazed** [kreɪzd] *adj* 1. dəli; ruhi xəstə; 2. **(about)** bir şeyin dəlisi; **to be ~ about *smb.*** bir kəsin vurğunu/dəlisi olmaq; *She is crazed about you O sənin vurğunundur, O səni dəlicəsinə sevir*

**craziness** ['kreɪzɪnɪs] *n* dəlilik, ağılsızlıq, dəli hərəkət, ağılsız iş

**crazy** ['kreɪzɪ] *adj* **(-ier, -iest)** 1. dəli, ağılsız; **to go ~** dəli olmaq, ağlını itirmək; *He is crazy with pain O, ağrıdan ağlını itirir; You must be crazy to go walking in such awful weather Belə dəhşətli havada gəzməyə çıxmaqla sən/siz dəli olmalısan / olmalısınız; He's crazy, he ought to be locked O dəlidir, o gərək qıfıllı yerdə saxlanılsın; That noise is driving me crazy O səs məni dəli edir;* 2. **(about)** bir şeyin dəlisi olmaq; bir şeyi çox sevmək; *She is crazy about pop music O, pop musiqisinin dəlisidir; I'm crazy about Turkish music Mən türk musiqisinin dəlisiyəm, Mən türk musiqisini çox / həddən artıq sevirəm;* **to be ~ about *smb.*** bir kəsi çox / həddən artıq sevmək, bir kəsdən ötrü dəli-divanə olmaq; *I'm crazy about you, darling Mən səni/ sizi çox sevirəm, Mən səndən/sizdən ötrü dəli-divanəyəm, əzizim;*
◊ **like ~** dəli kimi, dəli sürəti ilə

**crazy-house** ['kreɪzɪhaus] *n d.d.* dəlixana

**creak[1]** [kri:k] *n* cırıltı, cığıltı, xışıltı; **to hear a series of ~** davamlı xışıltı eşitmək

**creak[2]** [kri:k] *v* xışıldamaq, cırıldatmaq, cırıldamaq, xırçıldamaq; *The staircases creaked when I went down under my feet Mən aşağı düşəndə pilləkənlər ayağımın altında cırıldadı*

**creaker** ['kri:kə[r]] *n d.d.* qoca, qoca qadın

**creaking** ['kri:kɪŋ] *adj* cırıldayan; **~ shoes** cırıldayan ayaqqabı

**creaky** ['kri:kɪ] *adj* cırıldayan, xışıldayan; **~ door / staircases / bed, *etc.*** cırıldayan qapı / pilləkən / çarpayı və s.

**cream[1]** [kri:m] *n* 1. qaymaq; **sour ~** xama; **to skim the ~ from the milk** südün qaymağını almaq/yığmaq; 2. krem *(1) kosmetik yağ; 2) çəkmə yağı; 3) meyvə şirəsi, şokolad və s. qatılıb çalınmış qaymaqdan ibarət şirni);* 3. bir şeyin ən yaxşı hissəsi, qaymağı; **the ~ of the society** cəmiyyətin qaymağı; 4. krem rəngi; 5. köpük

**cream[2]** [kri:m] *v* 1. çalmaq *(yağı çıxana qədər),* qatmaq, qarışdırmaq; *Cream the butter and sugar (together) Yağı və qəndi (bir yerdə) qarışdır/qarışdırın;* 2. qaymağını/üzünü almaq *(südün);* **to ~ milk before using it** istifadə etməzdən əvvəl südün qaymağını/üzünü almaq; 3. ən yaxşısını seçmək *(bir şeyin); We cream off the cleverest pupils and send them to a special school Biz şagirdlərin ən ağıllılarını seçib xüsusi məktəbə göndəririk;* 4. köpükləmək; 5. qaymaq tökmək / əlavə etmək *(çaya və s.)*

**cream[3]** [kri:m] *adj* krem rəngli; **a ~ dress** krem rəngli paltar

**cream-cake** ['kri:mkeɪk] *n* kremli tort / pirojna

**creamer** ['kri:mə[r]] *n* qaymaq saxlamaq üçün qab, qaymaq qabı

**creamery[1]** ['kri:mərɪ] *n* 1. yağ zavodu; 2. pendir istehsal edən müəssisə; 3. süd mağazası

**creamery[2]** ['kri:mərɪ] *adj:* **~ butter** kərə yağı

**creaminess** ['kri:mɪnɪs] *n* 1. qaymaqlılıq, yağlılıq; 2. yumşaqlıq, zəriflik, məlahətlilik *(səs haq.)*

**creamy[1]** ['kri:mɪ] *n* səmənd at

**creamy[2]** ['kri:mɪ] *adj* 1. qaymaqlı, yağlı; **~ milk** qaymaqlı /yağlı süd; 2. krem rəngli, açıq-sarı rəngli; 3. kremli; **~ soap** kremli sabun; *Our new creamy soap will keep your skin soft and smooth Bizim yeni kremli sabunumuz sənin /sizin dərini / dərinizi yumşaq və hamar saxlayacaq;* 4. yumşaq, məlahətli, zərif *(səs haq.);* **a ~ voice** yumşaq / məlahətli / zərif səs

**crease[1]** [kri:s] *n* 1. qat, bükük; qırış; *You have got a crease in your dress where you've been sitting? Sənin/Sizin paltarında/paltarınızda qırış var, harada oturmusan / oturmusunuz?; Her dress was full of creases Onun paltarı bütün qırış-qırış idi; There are the tired creases around her eyes Onun gözlərinin ətrafında yorğunluqdan qırışlar var;* 2. at başı şəklində bəzək *(damda)*

**crease[2]** [kri:s] *v* 1. qat salmaq / əmələ gətirmək; 2. qırışmaq, bürüşmək; *This material creases very easily Bu parça çox asanlıqla qırışır / bürüşür;* 3. qırışmaq, qırış-qırış olmaq; *She wanted to wear her black dress but it was too creased O, qara paltarını geymək istəyirdi, lakin o tamam qırış-qırış idi; Pack the clothes carefully so that you don't crease them Paltarları elə diqqətlə qablaşdır / qablaşdırın ki, onları qırışdırmayasan / qırışdırmayasınız*

**create** [kri'eɪt] *v* 1. yaratmaq, törətmək, vücuda gətirmək; *God created the world Allah dünyanı yaratdı;* **to ~ a difficulty** çətinlik yaratmaq; **to ~ a disturbance** narahatlıq yaratmaq; **to ~ confusion** qarışıqlıq/qarmaqarışıqlıq yaratmaq; **to ~ an army** ordu yaratmaq; **to ~ opposition** müxalifət yaratmaq; 2. səbəb/bais olmaq, oyatmaq, doğurmaq; doğmaq; **to ~ a feeling** hiss oyatmaq; **to ~ a feeling of surprise** təəccüb hissi oyatmaq / doğurmaq; *His behaviour created a bad impression Onun davranışı pis təəssürat oyatdı;* 3. ad vermək; **to ~ *smb.* a peer** bir kəsə per *(İngiltərədə, Fransada yüksək zadəgan titulu)* adı vermək; 4. *d.d.* həyəcanlanmaq, narahat olmaq, vurnuxmaq; *You needn't create about it Bu barədə sənin/sizin narahat olmağına/olmağınıza ehtiyac yoxdur*

**creation** [kri:'eɪʃn] *n* 1. yaranma, yaratma, yara-

dılma, vücuda gətirmə; yaradılış; **the ~ of the world** dünyanın yaranması/yaradılması; 2. əsər *(elmi, ədəbi və s.)*; **~ of genius** dahiyanə əsər; 3. dünya, kainat; **the whole ~** kainat, dünya, bütün dünya / kainat;
◊ **to beat / to lick ~** gözlənildiyindən artıq olmaq

**creative** [krı'eıtıv] *adj* yaradıcı, yaradıcılıq; **~ work** yaracıdı iş; **~ thinking** yaradıcı təfəkkür; **~ ability** yaradıcılıq qabiliyyəti; **~ power** yaradıcılıq gücü

**creatively** [krı'eıtıvlı] *adv* yaradıcılıqla, yaradıcı bir tərzdə

**creativeness** [krı'eıtıvnıs] *n* = **creativity**

**creativity** [.krı:eı'tıvıtı] *n* yaradıcılıq; *Someone with creativity is needed for this job Bu işə yaradıcılıq qabiliyyəti olan bir adam lazımdır; Creativity and originality are more important than technical skill Yaradıcılıq və orijinallıq texniki bacarığdan daha vacibdir*

**creator** [krı'eıtəʳ] *n* 1. yaradan, yaradıcı; qurucu, törədən; 2. **the Creator** Allah, Yaradan, Tanrı

**creature** ['krı:tʃəʳ] *n* 1. yaratma, yaranma, yaradılma; yaranış; 2. varlıq, insan, adam; **a strange ~ from Mars** Marsdan gəlmiş qəribə varlıq/canlı; *She was a charming young creature O, cazibədar / valehedici gənc bir varlıq idi*; 3. *amer.* ev heyvanı

**credence** ['krı:dəns] *n* 1. inam, inanma, etibar; etimad; **to give ~ to gossip** dedi-qoduya inanmaq; **to give ~ to smb.** bir kəsə etibar etmək/inanmaq; *The newspapers are giving no credence to the government's latest statements Qəzetlər hökumətin son bəyanatlarına etibar etmir/inanmır*; **to find ~** etibardan iştifadə etmək; **to refuse ~** etimad göstərməmək; 2. *kils.* qurbangah

**credentials** [krı'denʃəlz] *n* 1. mandat; şəxsiyyəti təsdiq edən vəsiqə; **committee on ~** mandat komissiyası; 2. etimadnamə *(səfirin təqdim etdiyi sənəd)*

**credibility** [.kredı'bılıtı] *n* həqiqətə uyğunluq, doğruya oxşarlıq

**credible** ['kredəbl] *adj* doğruya oxşayan, həqiqətə uyğun, inanılacaq, ağılkəsən, mümkün ola bilən, ehtimal edilən, ağlabatan; etibar edilə bilən; **a ~ witness** etibar edilə bilən şahid; **a ~ news report** inanılacaq/ ağlabatan qəzet məlumatı; *It hardly seems credible Bu, ağlabatana / ağılkəsənə oxşamır*

**credibly** ['kredəblı] *adv* doğru, həqiqi, dürüst, səhih, gerçək; *I am credibly informed that... Mənə dürüst / səhih olaraq xəbər verdilər ki,...*

**credit**[1] ['kredıt] *n* 1. inam, etibar; **to give ~ to smth.** bir şeyə inanmaq; **to put/to place ~ in hearsay** şayiəyə inanmaq; **to lose ~** ehtibarını itirmək; 2. ad, şöhrət, yaxşı ad; *He is a man of credit O, yaxşı adlı/şöhrəti olan adamdır*; 3. namus, vicdan, şərəf, heysiyyət; məziyyət, ləyaqət; **to do smb. ~** bir kəsə şərəf gətirmək; *It is greatly to your credit that you have passed such a difficult examination Belə çətin imtahanı vermək sənə / sizə şərəf gətirir; The boy is a credit to his parents Oğlan valideynlərinin fəxridir*; 4. təsir, nüfuz; əhəmiyyət; hörmət, ehtiram; *He resolved to employ all his credit in order to prevent the marriage O, bu izdivaca mane olmaq üçün bütün nüfuzundan istifadə etməyi qərara aldı*; 5. *amer.* təhsil müəssisəsində bu və ya digər kursu qurtarmaq haqqında vəsiqə; 6. *d.d.* imtahanda ən yüksək qiymət; 7. *tic.* kredit; **to buy/ to sell on ~** kreditlə almaq / satmaq; *No credit is given in this shop Bu mağazada kreditlə heç nə verilmir / satılmır*; **long-term/short-term ~** uzunmüddətli / qısamüddətli kredit; **letter of ~** akkreditiv *(əmanət kassasına qoyulan pulu başqa əmanət kassalarından almaq üçün sənəd)*; 8. *müh.* kredit, mühasibat kitabının birinci üzü; **to place to the ~ of an account** kredit hesabına yazmaq; 9. kreditə yazılan məbləğ

**credit**[2] ['kredıt] *v* 1. inanmaq, etibar etmək; **to ~ a story/a statement/an author** hekayəyə / bəyanata / müəllifə inanmaq; 2. adına yazmaq *(bir kəsin)*; **to ~ smb. with a quality** bir keyfiyyəti bir kəsin adına yazmaq; *You would hardly credit him with having acted so foolishly Belə axmaq hərəkətin onun adına yazılması bəlkə də mümkün deyil*; 3. zaçot qəbul etmək, kurs keçmək haqqında vəsiqə vermək; 4. kredit vermək, pul buraxmaq; borc vermək; **to ~ a sum to smb.**, **to ~ smb. with a sum** bir kəsin hesabına kredit olaraq müəyyən məbləğ pul yazmaq, bir kəsə müəyyən məbləğ pul vermək

**creditable** ['kredıtəbl] *adj* tərifəlayiq, tərifli; şərəf /şöhrət gətirən; **~ attempt** tərifəlayiq səy; *Her story seems barely creditable Onun danışıqları çətin ki, inandırıcı olsun*; **an action ~ to him who performed it** icraçısına şərəf/şöhrət gətirən hərəkət; **a ~ witness** tərifəlayiq şəhadət

**creditor** ['kredıtəʳ] *n* kreditor, kredit / borc verən *(şəxs və ya müəssisə)*;
◊ *Creditors have better memories than debtors Borclu borclunun sağlığını istər*; ≅ *Hacı amində alacağın olsun, nə verər, nə yox deyər*

**credulity** [krı'djulıtı] *n* tez inanma, hamıya inanma; sadəlövhlük, sadədillik, hər şeyə inanma

**credulous** ['kredjələs] *adj* tez inanan, hər kəsə / şeyə inanan, sadəlövh, sadədil

**credulously** ['kredjuləslı] *adv* sadəlövhlüklə, sadədilliklə, sadəlövhcəsinə

**credulousness** ['kredjuləsnıs] *n* = **credulity**

**creed** [kri:d] *n* 1. kredo, məslək, əqidə, dünyagörüşü; **political ~** siyasi dünyagörüşü; **religious ~** dini əqidə/məslək; *In our country all men are treated equally without regard to race, social origin or religious creed Bizim ölkəmizdə irqindən, sosial mənşəyindən və dini əqidəsindən asılı olmayaraq insanların hamısına eyni münasibət göstərilir*; 2. *din.* məzhəb; 3. *kils.* inam rəmzi



**creek** [krı:k] *n* 1. balaca körfəz; çayın *(axar)* ağzı / mənsəbi; 2. qol *(çayda)*

**creel** [krı:l] *n* balıq daşımaq üçün səbət

**creep** [krı:p] *v (pt, pp* **crept***)* 1. sürünmək; iməkləmək; *The cat crept silently towards the mouse Pişik sakitcə siçana tərəf süründü*; 2. sürünə-sürünə getmək, çox ağır yerimək *(xəstə, qoca adamlar haq.)*; 3. dırmaşmaq, sarmaşmaq *(bitki haq.)*; *Ivy had crept the walls Sarmaşıq divarlara dırmaşmışdı/sarmaşmışdı*; 4. yavaş-yavaş /gizlincə/xəlvəti yaxınlaşmaq; 5. yaltaqlanmaq, yaltaqlıq etmək, quyruq bulamaq; 6. yaxınlaşmaq, üstünü almaq, qəfildən yaxalamaq *(zaman, yaş və s. haq.)*; *Old age comes creeping upon one unnoticed Qocalıq adamı qəfildən yaxalayır/adamın üstünü alır*; 7. ürpərmək, ürpəşmək; *This made her flesh creep Bu onun ətini ürpəşdirdi*; **to ~ away** sürünərək getmək / aradan çıxmaq; **to ~ in / into** sürünə-sürünə girmək; 8. qılığa girmək; **to ~ into smb.'s favour** bir kəsin qılığına girmək; **to ~ out** çıxmaq, sürünə-sürünə /yavaş-yavaş çıxmaq;
◊ *Learn to creep before you leap at. söz. Yeriməyi öyrənməzdən əvvəl iməkləməyi öyrən*; ≅ *Çayı keçməmiş hop demə*; **to have always a hole to ~ out** qaçmağa həmişə bir əl yeri qoymaq

**creeper** ['kri:pəʳ] *n* 1. *bot.* dırmaşan/sarmaşan bitki; 2. polzunka *(iməkləyən üşaq üçün geyim)*; 3. *zool.* sürünən heyvan

**creeps** [kri:ps] *n* bədən ürpərdici vahimə/ qorxu; *The old castle gives me creeps Qədim / Köhnə qəsr məndə ürpəşdirici vahimə yaradır*

**creepy** ['kri:pı] *adj* ətürpəşdirici, xoşa gəlməz, iyrənc, mənfur, nifrətoyadan; **a ~ old house** xoşagəlməz köhnə ev; **a ~ old man** iyrənc/nifrətoyadan qoca kişi

**cremate** [krı'meıt] *v* yandırmaq *(meyiti)*

**cremation** [krı'meıʃn] *n* kremasiya *(meyitlərin xüsusi peçlərdə yandırılması)*; **the cost of ~** meyitin kremasiya edilmə xərci

**cremator** [krı'meıtəʳ] *n* 1. meyit yandırmaq üçün xüsusi peç; 2. zibilləri / tullantıları və s. yandırmaq üçün peç

**crematoria** [.kremə'tɔ:rıə] *n* **crematorium** *isminin cəm forması*

**crematorium** [.kremə'tɔ:rıəm] *n* krematori

**crematory** ['kremətərı] *n* = **crematorium**

**crep** [kreıp] *n (həm də* **crêpe, crape***) fr.* 1. *toxuc.* krep *(qara rəngli zərif, nazik qırış-qırış parça)*; 2. matəm sarğısı; 3. krep *(təbii kauçuk)*

**crepitate** ['krepıteıt] *v* 1. xırtıldamaq, xırçıldamaq; 2. cırıldamaq; 3. xırıldamaq; xırıltı ilə danışmaq

**crepitation** [.krepı'teıʃn] *n* 1. xırtıltı, xışıltı; 2. cırıldama; 3. *tib.* xışıltılı səs *(ciyərlərdə)*

**crept** [krept] **to creep** *felinin pt, pp forması*

**crescent** ['kresnt] *n* 1. aypara, hilal; 2. aypara şəkilli hər hansı bir şey; 3. türk dövlətinin dövlət rəmzi; 4. islam; **the Crescent** İslam dini; **the Cross and the Crescent** Xristianlıq və İslam dini

**cress** [kres] *n bot.* vəzəri

**crest** [krest] *n* 1. pipik *(xoruzda)*; 2. kəkil *(quşda)*; 3. zirvə *(dağ, dalğa və s. haq.)*; 4. at başı şəklində bəzək *(damda)*

**crestfallen** ['krest.fɔ:lən] *adj* ruhdan düşmüş; qəmgin, məyus, kədərli, həzin, hüznlü; dilxor / pərt olmuş; *He returned empty-handed and crestfallen O, əliboş və məyus halda qayıtdı*

**cretin** ['kretın] *n* 1. kretin *(kretinizm xəstəliyinə tutulmuş adam)*; 2. *məc.* ağıldan kəm, gic

**cretinism** ['kretınızm] *n tib.* kretinizm *(kəmağıllıq)*

**crevice** ['krevıs] *n* çat, çatlaq, çatlamış yer, yarıq

**crew**[1] [kru:] *n* 1. ekipaj *(gəminin və s.)*; **airplane ~** təyyarə ekipajı; 2. bir yerdə/birgə işləyən adamlar, komanda; **racing ~** avarçəkənlər qrupu / komandası; 3. dəstə; **all the ~ of jobbers and swindlers** fırıldaqçılar və dələduzlar dəstəsi

**crew**[2] [kru:] *v* **to crow** *felinin pt forması*

**crewman** ['kru:mən] *n (pl* **-men** [-mən] heyətin / komandanın üzvü

**crib**[1] [krıb] *n* 1. körpələr evi, yasli; 2. yem təknəsi/qutusu, axur; 3. koma, daxma, kiçik otaq; 4. uşaq çarpayısı *(kənar divarları olan)*; 5. daqqa, iri yeşik / sandıq; 6. şparqalka

**crib**[2] [krıb] *v* (-bb-) 1. salmaq *(qapalı bir yerə)*; 2. yemlə təmin etmək; 3. ədəbi oğurluq etmək, başqasının əsərlərindən oğurlamaq, başqasının əsərini öz adına çıxmaq; 4. şparqalkadan istifadə etmək; köçürmək *(bir kəsdən)*; *He cribbed all the answers from my exercise-book O, bütün cavabları mənim tapşırıq dəftərimdən köçürdü*; 5. oğurlamaq

**cribbage** ['krıbıdʒ] *n* 1. kribic *(qumar oyunu)*; 2. *d.d.* ədəbi oğurluq, plagiat

**crick**[1] [krık] *n* əzələ dartılması *(xüs. boyun əzələsinin)*

**crick**[2] [krık] *v* I əzələsini dartmaq; **to ~ one's neck** boyun əzələsini dartmaq

**crick** [krık] *v* II 1. kəsik-kəsik bərk səs çıxarmaq; cırıldamaq; 2. bədənin müəyyən hissəsini xırtdatmaq *(barmağı və s.)*

**cricket**[1] ['krıkıt] *n* *id.* kriket *(ağacla oynanılan top oyunu)*

**cricket**[2] ['krıkıt] *v* kriket oynamaq

**cricketer** ['krıkıtəʳ] *n* kriket oynayan/ oyunçusu

**crier** ['kraıəʳ] *n* 1. çığırqan, qışqırqçı; 2. *tar.* carçı

**crime** [kraım] *n* 1. cinayət; **war ~s** hərbi cinayətlər; **~s against humanity** bəşəriyyətə qarşı cinayətlər; **to commit a ~** cinayət etmək / törətmək; **to be steeped in ~** cinayət içində olmaq; **an increase in ~** cinayətin artımı; **organized ~**

mütəşəkkil cinayət; *He took to a life of crime O, cinayətə qurşandı;* 2. yaramaz / yersiz hərəkət; cinayət; *It's a crime to waste money like that Bu şəkildə/cür pul xərcləmək cinayətdir; It's a crime the way he bullies his children Onun uşaqları ilə belə qaba rəftar etməsi cinayətdir*

**crimeful** ['kraımful] *adj* cinayətkar; ~ **deeds** cinayətkar əməllər

**crimeless** ['kraımlıs] *adj* günahsız, günahı/cinayəti / suçu olmayan

**criminal¹** ['krımınl] *n* cinayətkar, cani; **war** ~ hərbi cani/cinayətkar; **habitual** ~ peşəkar cani/cinayətkar, residivist *(dəfələrlə cinayət edən adam); The judge sent the criminal to prison for 4 years Hakim cinayətkara 4 il həbs cəzası kəsdi / cəzasına məhkum etdi*

**criminal²** ['krımınl] *adj* cinayətkar, cinayət; ~ **action** 1) cinayət əməli / işi; 2) cinayət iddiası; ~ **case** cinayət işi; ~ **code** cinayət kodeksi/məcəlləsi; ~ **law** cinayət hüququ/qanunu; ~ **intention** cinayətkar niyyət / qərəz

**criminalist** ['krımınəlist] *n* kriminalist *(kriminalistika mütəxəssisi olan hüquqşünas)*

**criminalistics** [,krımınə'lıstıks] *n hüq.* kriminalistika *(cinayətlər haqqında hüquq elmi)*

**criminality** [,krımı'nælıtı] *n* cinayət; cinayət xarakteri daşıma

**criminally** ['krımınəlı] *adv* cinayətkarcasına; cinayət qanununa müvafiq olaraq; **to proceed against** *smb.* ~ bir kəsi cinayət qanununa uyğun olaraq məhkəməyə cəlb etmək

**criminate** ['krımıneıt] *v* 1. cinayət etməkdə ittiham etmək; təqsirləndirmək, müqəssir bilmək / etmək; 2. ittiham hökmü çıxarmaq

**crimination** [,krımı'neıʃn] *n* 1. cinayət ittihamı; 2. ciddi töhmət / məzəmmət

**criminative** ['krımınətıv] *adj* ittihamedici, ittiham; ifşaedici

**criminator** ['krımıneıtəʳ] *n hüq.* ittihamçı

**criminology** [,krımı'nɔlədʒı] *n* kriminologiya *(cinayəti ictimai bir hadisə kimi tədqiq edən elm)*

**crimson¹** ['krımzn] *n* 1. moruq rəngi; 2. tünd-qırmızı rəng; 3. tünd qızartı/allıq/qırmızılıq

**crimson²** ['krımzn] *adj* moruq rəngli, tünd qırmızı; ~ **flower** moruq rəngli çiçək

**crimson³** ['krımzn] *v* 1. moruq rənginə boyamaq; 2. bərk qızarmaq / allanmaq

**cringe¹** [krındʒ] *n* yaltaqlıq, alçalma, köləcəsinə səcdə / sitayiş etmə, riyakarlıq, ikiüzlülük

**cringe²** [krındʒ] *v* 1. yaltaqlıq/riyakarlıq/ ikiüzlülük/sitayiş etmək; alçalmaq; 2. büzüşmək, yığılmaq, qısılmaq; *The dog cringed at the sight of the whip Qamçını görəndə it büzüşdü / qısıldı*

**cringer** ['krındʒəʳ] *n* yaltaq, riyakar, ikiüzlü, alçaq

**crinkle¹** ['krıŋkl] *n* qat, büküş; qırış, qırış-qırış olma

**crinkle²** ['krıŋkl] *v* 1. burulmaq, qıvrılmaq, qatlanmaq; *The paper blackened, crinkled (up) and burned to ashes Kağız qaraldı, buruldu və yanıb kül oldu/külə döndü;* 2. qırışmaq, qırışdırmaq; qırış-qırış olmaq; 3. burmaq; burdurmaq *(saçı);* 4. xışıldamaq; yumşaq xışıltı səsi çıxartmaq

**crinkled** ['krıŋkld] *adj* qırışmış, qırış-qırış olmuş; *I can't wear this dress, it's all crinkled Mən bu paltarı geyə bilmirəm, o, bütün qırış-qırışdır*

**crinkly** ['krıŋklı] *adj* 1. qırışıq, qırış-qırış; ~ **plastic packing material** qırış-qırış plastik qablama/qablaşdırma materialı; 2. qıvrımsaç, buruqsaç, dalğavarı *(saç haq.)*

**cripple¹** ['krıpl] *n* çolaq, şil, şikəst, əlil; **war** ~**s** müharibə əlilləri;

◊ *He that lives with cripples learns to limp, He that dwells next door to a cripple will learn to halt Çolaqla yaşayan axsamaq öyrənər ≅ Atı atın yanına bağlasan həmrəng olmasa da, həmxasiyyət olar*

**cripple²** ['krıpl] *v* 1. çolaq/şikəst/əlil etmək; 2. zədə almaq, xarab etmək, korlamaq; *The ship was crippled in the storm Tufan zamanı gəmi zədə aldı;* 3. *məc.* zəifləmək, zəiflətmək, ziyan vurmaq; *The trade is crippled by the difficulty of transport Nəqliyyat çətinliyinə görə ticarət zəifləyib;* 4. axsamaq, azca axsamaq; 5. *hərb.* vurub sıradan çıxartmaq *(tankı, maşını və s.)*

**crises** ['kraısı:z] **crisis** *isminin cəm forması*

**crisis** ['kraısıs] *n (pl* **crises***)* 1. böhran; **economic/ industrial/financial/governmental** ~ iqtisadi /sənaye/maliyyə/hökumət böhranı; **the general** ~ **of capitalism** kapitalizmin ümumi böhranı; 2. kritik/həlledici an; **to bring to a** ~ kritik ana çatdırmaq; *Things are coming / drawing to a crisis Həlledici / Kritik an başlanır;* **to pass through a** ~ kritik anı keçirmək; 3. *tib.* xəstəliyin kritik / ən ağır anı; *The fever has passed its crisis Qızdırmanın kritik anı keçib*

**crisp¹** [krısp] *n* 1. *pl* xırçıldayan kartof *(paketdə satılan);* xırçıldayan qazmaq; 2. *d.d.* kağız pul

**crisp²** [krısp] *adj (-er, -est)* 1. xırtıldayan, xırçıldayan; kövrək; tezovulan; ~ **snow / apples / vegetables** xırtıldayan qar / alma /tərəvəz; ~ **biscuit** kövrək/ tezovulan peçenye; **a** ~ **new banknote** təzə, xırtıldayan kağız pul; 2. tər, təzə; ~ **lettuce** tər kahı; 3. canlandıran, ruhlandıran; soyuq, təmiz, quru, sərin; **the** ~ **air of an autumn morning** payız səhərinin təmiz/ sərin havası; 4. canlı, əla, gözəl *(üslub, nitq haq.);* ~ **repartee** əla / çox gözəl hazırcavablıq; 5. qətiyyətli, cəsarətli, ürəkli, səbatlı *(hərəkət və s. haq.);* **a quick** ~ **reply** tez/cəsarətli/qətiyyətli cavab; *What he said was crisp and decided Onun dediyi cəsarətli və qətiyyətli idi;* 6. buruq, burulmuş, qıvrım-qıvrım, buruq-buruq *(saç haq.);* 7. çopurlu, çopurla örtülü

**crisp³** [krısp] *v* 1. xırtıldamaq; **to** ~ *one's* **fingers** barmaqlarını xırtıldatmaq; 2. kövrək/xırtıldayan etmək; **to** ~ **the bread up in the oven** çörəyi sobada xırtıldayacaq hala salmaq; 3. burmaq; burulmaq; hörmək, hörülmək; 4. çopurlaşmaq, çopurla örtülmək; 5. dalğalandırmaq, ləpələndirmək; *A cooling breeze crisps the river Sərin meh çayı ləpələndirir*



**crispin** ['krıspın] *n* başmaqçı, çəkməçi

**crisply** ['krısplı] *adv* cəsarətlə, əzmlə, mətanətlə, qətiyyətlə, əzmkarlıqla

**crispy** ['krıspı] *adj* 1. *şair.* qıvrım-qıvrım, buruq-buruq, buruq, burulmuş *(saç haq.);* ~ **locks** qıvrım saçlar/tellər; 2. xırtıldayan; ~ **crust** xırtıldayan qazmaq/qabıq; 3. təzə, təmiz, sərin *(hava haq.)*

**criss-cross¹** ['krıskrɔs] *n* 1. xaç *(savadsız adamın imza əvəzinə etdiyi işarə);* 2. *id.* topu çarpaz şəklində ötürmə və ya vermə

**criss-cross²** ['krıskrɔs] *adj* çarpazlaşan, çarpaz;~ **lines** çarpazlaşan/çarpaz xətlər

**criss-cross³** [krıskrɔs] *v* 1. üstündən xaç çəkmək; çarpaz qoymaq; qırışmaq; kəsişmək; **railway lines** ~**ing in a complex network** mürəkkəb şəbəkədə bir-birini kəsən dəmiryol xəttləri; 2. çarpazlaşdırmaq

**criss-cross⁴** ['krıskrɔs] *adv* 1. çal-çarpaz; 2. çəpinə, çəpəki, qıyğac; 3. *məc.* əksinə, tərsinə; *Everything went criss-cross from the start Başlanğıcdan hər şey tərsinə / əksinə getdi*

**criteria** [kraı'tıərıə] *n* **criterion** *isminin cəm forması*

**criterion** [kraı'tıərıən] *n (pl* **-ria**, *həm də* **-s** [-z]) kriteriya, meyar, ölçü

**critic** ['krıtık] *n* 1. tənqidçi; 2. tənqidbaz, kritikan

**critical** ['krıtıkəl] *adj* 1. tənqidi; ~ **analysis** tənqidi təhlil; ~ **remarks** tənqidi qeydlər; **a** ~ **report** tənqidi məruzə; 2. kritik, çox ağır/ çətin; böhranlı, qorxulu; **the** ~ **stage of a disease** xəstəliyin kritik / böhranlı mərhələsi; *The patient's condition is critical Xəstənin vəziyyəti çox ağırdır;* ~ **condition of health** sağlamlığın kritik vəziyyəti; 3. həlledici, dönüş; *We are at a critical time in our country's history Biz vətənimizin tarixində dönüş/həlledici dövründəyik*

**critically** ['krıtıkəlı] *adv* tənqidi, tənqidi surətdə; **to speak** ~ **of** *smb.* **/ of** *smth.* bir kəs / bir şey haqqında tənqidi danışmaq

**critisism** ['krıtısızm] *n* 1. tənqid; **slashing / violent/ bitter** ~ məhvedici/ amansız/ kəskin tənqid; **to suffer harsh** ~ **from** *smb.* bir kəs tərəfindən amansız / sərt / şiddətli tənqidə məruz qalmaq; **beneath** ~ tənqidə layiq olmama; *He hates / can't take criticism O, tənqidə nifrət edir / tənqidi qəbul edə bilmir;* 2. tənqidi qeyd/ məqalə; **literary** ~ ədəbi tənqid; 3. *fəls.* kritisizm *(tənqidi fəlsəfə)*

**criticize, -ise** ['krıtısaız] *v* 1. tənqid etmək; **to** ~ **an author / a play** *etc.* müəllifi / pyesi və s. tənqid etmək; *Stop criticizing my work Mənim işimi tənqid etməyi qurtarın/dayandırın; The minister criticized my decision Nazir mənim qərarımı tənqid etdi;* 2. fikir/mülahizə bildirmək; *Would you like to read and criticize my new book? Sən/ Siz mənim yeni kitabımı oxuyub ona öz fikrini/fikrinizi bildirərsənmi/bildirərsinizmi?*

**critique** [krı'tı:k] *n* 1. tənqid; **Marx's** ~ **of Hegel** Marksın Hegeli tənqidi; 2. tənqidi fikir/mülahizə; *The book presents a critique of the government's economic policies Bu kitabda hökumətin iqtisadi siyasəti haqqında tənqidi mülahizələr söylənilir*

**croak¹** [krouk] *n* 1. vaqqıltı, quruldama; 2. qarıldama; 3. qurultu *(qarında)*

**croak²** [krouk] *v* 1. quruldamaq *(qurbağa haq.),* vaqqıldamaq *(bayquş haq.);* 2. qarıldamaq *(qarğa haq.);* 3. donquldanmaq, deyinmək; mırtıldanmaq; 4. bəd danışmaq, fal açmaq, qarğış etmək; 5. fəlakəti qabaqcadan görmək / xəbər vermək; **to** ~ **disaster** bədbəxtliyi əvvəlcədən xəbər vermək

**Croat** ['krouət] *n* 1. xorvat; **the** ~**s** *top. i* xorvatlar; 2. xorvat dili; **to speak** ~ xorvat dilində danışmaq

**Croatian** [krou'eıʃıən] *adj* xorvat; **the** ~ **language** xorvat dili

**crochet¹** ['krouʃeı] *n fr.* 1. tambur vasitəsi ilə naxış tikmə; 2. tambur qırmağı

**crochet²** ['krouʃeı] *v fr.* tamburla naxış tikmək

**crocheted** ['krouʃeıtıd] *adj* toxunma, toxunmuş; a ~ **skirt** toxunmuş/toxunma yubka

**crock** [krɔk] *n* gildən hazırlanmış yekə / iri bardaq

**crockery** ['krɔkərı] *n* qab-qacaq *(fincan, boşqab və s.)*

**crocodile** ['krɔkədaıl] *n* 1. *zool.* timsah; 2. timsah dərisi;

◊ **to shed** ~ **tears** yalançı göz yaşları axıtmaq, riyakarcasına ağlamaq; *She shed crocodile tears when she dismissed me from my job O məni işdən çıxaranda riyakarcasına ağladı*

**crocus** ['kroukəs] *n* 1. *bot.* krokus, zəfəran; 2. *tex.* krokus *(metal və ya daş şeyləri cilalamaq üçün işlədilən dəmir poroşok);* 3. *jarq.* fırıldaqçı həkim

**crook¹** [kruk] *n* 1. qarmaq, çəngəl; çəftə; əyri başlı əl ağacı; 2. əyri başlı çoban çomağı; 3. döngə, əyri *(çay, yol və s. haq.);* 4. qoz, donqar; **a** ~ **in the back** beldə qoz / donqar; 5. fırıldaqçı, tülüngü, yalançı, kələkbaz, cüvəllağı, haramzadə

**crook²** [kruk] *adj* nasaz, naxoş, xəstə; *I'm a bit crook Mən bir az nasazam/naxoşam*

**crook³** [kruk] *v* 1. əymək, bükmək, qatlamaq; əyilmək, bükülmək, qatlanmaq; 2. eşmək, əyirmək; eşilmək, əyrilmək; 3. belini bükmək / əymək; beli bükülmək / əyilmək; 4. qarmaqla tutmaq

**crooked** ['krukıd] *adj* 1. əyri, əyri-üyrü; əyilmiş, bükülmüş, büküк; **a** ~ **branch** əyri budaq; **a** ~ **street** əyri-üyrü küçə; 2. yalançı, qeyri-səmi-

mi; a ~ **smile** qeyri-səmimi/yalançı təbəssüm; *All the officials are crooked Bütün məmurlar yalançıdırlar / qeyri-səmimidirlər*

**crookedly** ['krukıdlı] *adv* 1. əyri, çəp, çəpinə, qıyğac, qıyğacı; 2. riyakarcasına, qeyri-səmimi; **to smile** ~ riyakarcasına gülümsəmək

**crookedness** ['krukıdnıs] *n* 1. əyrilik, əyri yer; 2. əyri-üyrülük; 3. namussuzluq, şərəfsizlik

**croon** [kru:n] *v* pəsdən oxumaq; **to ~ a song** pəsdən mahnı oxumaq, mahnını zümzümə etmək; **to ~ to oneself** öz-özünə mahnını pəsdən oxumaq

**crooner** ['kru:nə'] *n* estrada müğənnisi

**crop[1]** [krɔp] *n* 1. məhsul; **the rice** ~ düyü məhsulu; **a good ~ of apples** yaxşı alma məhsulu; **the potato** ~ kartof məhsulu; **a bumper** ~ çox böyük/rekord məhsul; *The main crops are maize and coffee in this country Bu ölkədə əsas məhsul qarğıdalı və kofedir;* 2. biçilməmiş taxıl; əkin; 3. *k.t.* bitki, becərilən bitki, dənli bitkilər; **to spray the ~ with chemicals** bitkiləri kimyəvi maddələrlə çiləmək; **to treat the ~s with pesticides** bitkilərə pestisid vurmaq/çiləmək; 4. çinədan *(quşlarda)*; 5. *dial.* mədə, qarın, gödən; 6. qamçı/ qırmanc dəstəyi; 7. qısa saçvurma; 8. bolluq, çoxluq, çox, çoxlu; bir qucaq; **a ~ of questions** çoxlu sual; **a ~ of letters** çoxlu / bir qucaq məktub

**crop[2]** [krɔp] *v* (-pp-) 1. otu yolmaq; kol-kosu yemək *(heyvan haq.)*; *Sheep cropped the grass Qoyunlar otları yedilər;* 2. məhsul vermək / gətirmək; *The potatoes cropped well this year Bu il kartof yaxşı məhsul verdi; Lemons are cropped three times a year Limu ildə üç dəfə məhsul verir;* 3. qısa kəsmək, vurmaq *(tük, saçı)*; **to ~ the hair** saçı kəsmək / vurmaq; **to ~ the ears** qulaqları kəsmək *(tük, it haq.)*; **to ~ the tail of a horse** atın quyruğunu kəsmək *(yəni quyruğunun qılını kəsib gödəltmək)*; 4. budamaq, kəsmək *(budağı)*; 5. qoparmaq *(çiçəyi)*; 6. səpmək, basdırmaq; **to ~ a field with wheat** tarlaya buğda səpmək; *The farmer decided to crop the field with potatoes Fermer sahəyə kartof basdırmağı qərara aldı*; **to ~ up** gözlənilmədən peyda olmaq; *I shouldn't be surprised if he cropped up this evening O bu axşam peyda olsa mən əsla təəccüblənmərəm; Unexpected difficulties cropped up Gözlənilməz çətinliklər peyda oldu / meydana çıxdı;*
◊ **to ~ smb.'s feathers** bir kəsin burnunu ovmaq, bir kəsi susdurmaq, bir kəsin ağzından vurmaq

**crop-eared** ['krɔpıəd] *adj* kəsikqulaq, qulağıkəsik; ~ **dog** kəsikqulaq / qulağıkəsik it

**cropper** ['krɔpə'] *n* I 1. biçinçi, otçalan, kərəntiçi; 2. fermer *(xüs. ABŞ-ın pambıq əkilən rayonlarında)*; 3. otçalan/taxılbiçən maşın; 4. bol/yaxşı məhsulverən bitki; **light / poor** ~ yaxşı / pis məhsulverən bitki; *Beans were good croppers this year Lobya / Paxla bu il yaxşı məhsul verdi*

**cropper** ['krɔpə'] *n* II *d.d.* 1. bərk yıxılma; 2. tam iflas, tamamilə iflasa / müvəffəqiyyətsizliyə uğrama, tam uğursuzluq
◊ **to come a ~** 1) yıxılmaq *(başıüstə)*; 2) iflasa /müvəffəqiyyətsizliyə uğramaq; **to come ~ in an examination** imtahanda kəsilmək, imtahan verə bilməmək

**croquet** ['kroukeı] *n fr.* kroket *(meydançada düzülmüş şarları ağac çəkiclə vurub məftil qapılardan keçirməkdən ibarət idman oyunu)*

**cross[1]** [krɔs] *n* 1. xaç; **to make one's ~, to sign with a ~** xaç qoymaq *(imza əvəzinə)*; *The teacher put a cross next to my name Müəllim mənim adımın qarşısında xaç işarəsi qoydu; The cities are marked on the map with a cross Şəhər xəritədə xaç işarəsilə işarə edilib;* **to make the sign of the ~** xaç çevirmək; 2. çarmıx; çarmıxa çəkmə; 3. xaçşəkilli başdaşı / qəbirdaşı; 4. **the Cross** xristianlıq, xristian dini, xaçpərəstlik; 5. xaç formasında orden; 6. bir kəsin qismətinə düşən sınaq /əzab-əziyyət; 7. xoşagəlməz/ acınacaqlı vəziyyət; *The slightest cross puts him out of humour Xırdaca bir xoşagəlməz hadisə onun əhvalını korlayır;* 8. *d.d.* əyri/ şərəfsiz hərəkət; **double** ~ yalan, aldatma, hiylə, kələk, fırıldaq; **on the** ~ fırıldaq / kələk / aldatma yolu ilə; *He has been on the cross all his life O, ömrü boyu fırıldaqla məşğul olub;* 9. üstündə xaç şəkli həkk edilmiş sikkə; 10. *tex.* çarpaz;
◊ **International Red Cross** Beynəlxalq Qırmızı Xaç; **on the** ~ çəpinə; **~ and / or pile** *arx.* 1) oryol-reşka; 2) tam təsadüf; **to take the ~** *tar.* əhli-səlibçi olmaq

**cross[2]** [krɔs] *adj* (-er, -est) I 1. köndələn; kəsişən; çarpaz; 2. qarşı, əks; ~ **wind** qarşı külək; 3. zidd, əks; ~ **interests** zidd maraqlar; 4. əlverişsiz, istənilməyən, yaramayan; ~ **weather** əlverişsiz hava;
◊ ~ **voting** öz partiyasının əleyhinə səsvermə

**cross** [krɔs] *adj* (-er, -est) II *d.d.* acıqlı, hirsli, qəzəbli, qeyzli; tündxasiyyət; **to be ~ with** *smb.* bir kəsə acığı tutmaq, bir kəsə qeyzlənmək / hirslənmək; **to make** *smb.* ~ bir kəsi hirsləndirmək/qəzəbləndirmək/qeyzləndirmək; ~ **words** acı/kəskin sözlər; ~ **answer** acıqlı/kəskin cavab

**cross[3]** [krɔs] *v* 1. keçmək; **to ~ the Atlantic** Atlantik okeanını keçmək; **to ~ a bridge / a road** körpünü / yolu keçmək; **to ~ a river** çayı keçmək; **to ~ the finish line** *id.* 1) finiş xəttini keçmək; 2) qalib gəlmək, udmaq; 2. **at the spot where two roads** ~ iki yolun kəsişməsində/kəsişdiyi yerdə; 3.: **to ~ oneself** xaç çevirmək; 4. üstündən xətt çəkmək; **to ~ a "t"** "t" hərfinin başından xətt çəkmək; 5. *d.d.* at minmək, oturmaq *(atın belində)*; 6. ayrılmaq, aralanmaq; *We crossed each other on the way Biz yolda bir-birimizdən ayrıldıq;* 7. çarpazlamaq; üst-üstə qoymaq/ aşırmaq; **to ~ one's legs** ayağını-ayağı-



nın üstünə aşırmaq; **to ~ one's arms on one's breast** əllərini/qollarını sinəsi üstündə çarpazlamaq; **to ~ out/off** pozmaq; **to ~ smb.'s name off the list** bir kəsin adını siyahıdan pozmaq/çıxartmaq; **to ~ out words/sentences** sözləri/cümlələri pozmaq;
◊ **to ~ one's mind** başına / ağlına fikir gəlmək; **to ~ one's t's and dot one's i's** hər şeyi izah etmək, məsələni qəti olaraq həll etmək; **to ~ smb.'s path** 1) həyat yolunda bir şeyə təsadüf etmək; 2) bir kəsə mane olmaq, bir kəsə əngəl törətmək; **to ~ the floor of the House** bir partiyadan digərinə keçmək *(parlamentdə)*; **to ~ the aisle** öz partiyasına qarşı səs vermək *(parlamentdə)*; **to ~ the river** 1) maneəni aradan qaldırmaq/götürmək; 2) ölmək; **to ~ smb.'s palms** bir kəsi ələ almaq; bir kəsə rüşvət vermək; **officials whose palms had been ~ed** satın ələ alınmış məmurlar *(rüşvətlə, pulla, bəxşiş və s. ilə)*

**cross-bearer** ['krɔs,beərə'] *n* xaç gəzdirən *(kilsədə ibadət zamanı)*

**cross-bench** ['krɔsbentʃ] *n* ingilis parlamentində müstəqil deputatlar üçün skamya

**cross-bencher** ['krɔs,bentʃə'] *n* parlamentin müstəqil deputatı *(ingilis parlamentində)*

**cross-birth** ['krɔsbə:θ] *n tib.* tərs gəlmiş uşağın doğulması / doğdurulması

**cross-breed** ['krɔsbrı:d] *n* calaq; metis, meləs, hibrid

**cross-country** ['krɔs'kʌntrı] *n id.* kross *(düz olmayan yerdə qaçış)*

**cross-cut** ['krɔskʌt] *n* 1. ən qısa yol; 2. köndələn kəsik

**cross-eye** ['krɔsaı] *n* çəpgözlük, çaşlıq, çəplik *(gözdə)*

**cross-fire** ['krɔs,faıə] *n hərb.* çarpaz atəş

**cross-grained** ['krɔsgreınd] *adj* 1. tərs, inad, inadcıl, inadkar, kəc; 2. deyingən; acıqlı, hirsli, qəzəbli

**cross-heading** ['krɔs,hedıŋ] *n* yarımsərlövhə; ikinci / əlavə sərlövhə *(qəzetdə)*

**cross-headwind** ['krɔs'hedwınd] *n* yandan/ qarşıdan əsən külək

**crossing** ['krɔsıŋ] *n* 1. pozma; 2. kəsişmə; kəsişmə nöqtəsi; qovuşuq yer; 3. dördyol ağzı, dörd yol; keçid *(küçədən)*; 4. *biol.* cütləşdirmə, cütləşmə

**cross-legged** ['krɔslegd] *adv* ayağını-ayağının üstünə aşırıb /aşıraraq; bardaş qurub / quraraq; *She was sitting cross-legged on the floor O, bardaş qurub döşəmədə oturmuşdu*

**cross-light** ['krɔslaıt] *n* 1. çəpəki işıq, çəpəki işıqla işıqlandırma; 2. kəsişən işıq şuaları

**crossline** ['krɔslaın] *n* = **cross-heading**

**crossly** ['krɔslı] *adv* 1. hirslə, acıqla, hirsli / acıqlı halda; acıqlı-acıqlı, hirsli-hirsli; 2. deyingəncəsinə, davakarcasına, öcəşkənliklə

**crossness** ['krɔsnıs] *n* 1. tez acıqlanma / hirslənmə; acıqlılıq, hirslilik; tündməcazlıq, əsəbilik; 2. deyingənlik, davakarlıq, dalaşqanlıq, öcəşkənlik

**crossover** ['krɔs,ouvə'] *n* 1. *amer.* keçid; kəsişən yollar üstündən salınan körpü; 2. sinə üstündə çarpaz örtülən qadın şalı / yaylığı; 3. bir-birini kəsən əlvan zolaqları olan parça

**cross-patch** ['krɔspætʃ] *n d.d.* deyingən / daim donquldanan qadın / qız

**cross-piece** ['krɔspi:s] *n* 1. köndələn atılan tir; 2. *tex.* çarpaz, krestavina

**cross-road[1]** ['krɔsroud] *n* 1. kəsişən yol; iki magistralı birləşdirən yol; 2. *pl* dördyol ağzı; 3. yolayrıcı; həlledici an; **at the ~s** yolayrıcında

**cross-road[2]** [krɔsroud] *adj* 1. yol arasında olan; ~ **hotel / tavern** yolayrıcında olan mehmanxana /aşxana; 2. tərəddüd edən; ~ **politician** tərəddüd edən / qətiyyətsiz siyasətçi

**cross-talk** ['krɔstɔ:k] *n* 1. əngəl, maneə; telefon danışığına mane olma; 2. = **back-talk**

**cross-tie** ['krɔstaı] *n d.y.* şpal *(dəmiryol relslərinin altına düzülən ağac və ya metal tir)*

**cross-way** ['krɔsweı] *n* = **cross-road[1]**

**cross-wind** ['krɔswınd] *n* qarşıdan əsən külək; *Strong cross-winds blew the plane off course Qarşıdan əsən güclü külək təyyarəni kursundan çıxartdı*

**cross-wise** ['krɔswaız] *adv* çəpəki/çarpaz şəkildə

**crossword** ['krɔswə:d] *n* krossvord *(çarpazlaşan sözləri tapmaqdan ibarət bilməcə)*; **to do a ~** krossvord həll etmək; *I have done the crossword Mən krossvordu həll etmişəm*

**crotch** [krɔtʃ] *n* paça; **the ~ of the trousers** şalvarın paçası

**crotchet** ['krɔtʃıt] *n* 1. qarmaq, çəngəl; 2. fantaziya, ədabazlıq, qəribəlik, şıltaqlıq; 3. *mus.* dörddə bir not

**crotcheteer** [,krɔtʃı'tıə'] *n* xəyalpərəst, xəyalçı, fantaziyaçı adam

**crotchety** ['krɔtʃıtı] *adj* 1. qəribə, əcaib; şıltaqçı, şıltaq; 2. hövsələsiz, səbirsiz, mübahisə / şikayət etməyi sevən

**crouch[1]** [krautʃ] *n* 1. əyilmə, sinmə; 2. yarı çömbəlmə *(yüngül atletikada)*

**crouch[2]** [krautʃ] *v* 1. çömbəlmək, sinmək; *The cat crouched, ready to pounce Pişik atılmağa hazır vəziyyətdə sinmişdi;* 2. diziüstə çökmək, ayağına düşmək; yaltaqlıq etmək, yaltaqlanmaq; alçalmaq; **to ~ one's back before smb.** bir kəsin qarşısında əyilmək/alçalmaq/yaltaqlıq etmək / boyun əymək

**croup** [kru:p] *n* 1. sağrı *(atlarda)*; 2. *zaraf. anat.* yan, sağrı *(adamlarda)*

**crow[1]** [krou] *n* I *zool.* alaqarğa;
◊ **white ~** əcaib adam; **as the ~ flies** düz xətlə, düz xətt üzrə; düzünə; *It's only a mile to my house as the crow flies, but over four miles by road Mənim evimə düzünə məsafə bir mildir,*

*lakin yolla dörd mildir; Crow will not pick out crow's eyes at. söz.* ≅ *İt itin ayağını basmaz*

**crow** [krou] *n* II **1**. quqquldama *(xoruz);* **2**. sevincək səs çıxarma *(uşaq haq.)*

**crow** [krou] *n* III *anat.* mezenterim *(bağırsaqları qarın boşluğunun dal divarına bağlayan periton büküşü)*

**crow**[2] [krou] *v (pt* **crowed**, **crew**; *pp* **crowed**, **crown***)* **1**. quqquldamaq, banlamaq *(xoruz haq.);* **2**. sevincək səs çıxarmaq *(uşaq haq.);* **to ~ over** qalib / üstün gəlmək *(düşmənə)*

**crowbill** ['kroubıl] *n* cərrah qayçısı

**crowd**[1] [kraud] *n* **1**. izdiham, dəstə, yığın, camaat; **a ~ waiting for a bus** avtobus gözləyən camaat; *He pushed his way through the crowd O, izdihamın arasında özünə yol açdı; There were crowds of people at the theatre Teatrda bir yığın adam vardı;* **2**. **the ~** adi adamlar, xalq, qara camaat; *He writes all his books for the crowd rather than for specialists O, kitablarının hamısını mütəxəssislərdən daha çox qara camaat üçün / adi adamlar üçün yazır;* **3**. basabas, basırıq; tünlük; *The audience was large, but there was no crowd Tamaşaçılar çox idi, lakin basabas yox idi;* **4**. çox, çoxlu, bir aləm; *There was a crowd of books and papers on his table Onun stolunun üstündə çoxlu / bir aləm kitab və kağız vardı;*

◊ **to follow / to go with the ~** ≅ palaza bürünüb ellə sürünmək; *Follow the crowd* ≅ *at. söz. Palaza bürün, ellə sürün*

**crowd**[2] [kraud] *v* **1**. yığışmaq, toplaşmaq; bir-birini itələmək; **to ~ round** *smb./ smth.* bir kəsin /şeyin ətrafına toplaşmaq; *We all crowded round the table Biz hamımız stolun ətrafına toplaşdıq; People crowded round the scene of the accident Camaat hadisənin baş verdiyi yerə yığışdı/toplaşdı;* **2**. doldurmaq, dolmaq; həddən artıq doldurmaq; *The room was crowded with furniture Otaq mebellə doldurulmuşdu; He crowded as many books as possible on the shelf O, şkafa mümkün olan qədər kitab doldurdu; The streets are crowded with people Küçələr adamlarla/ camaatla doludur;* **3**. basabas salmaq, basmaq; *Don't crowd so; stand back! Belə basabas salma!/salmayın!; bir az geri dur! /durun!* **to ~ into 1**) basmaq, soxmaq, tıxamaq, yerləşdirmək, pərçim etmək; **to ~ books into a box** kitabları qutuya /yeşiyə yerləşdirmək; **2**) soxulmaq, basılmaq, pərçim olmaq; dürtülmək; *They crowded into the hall Onlar zala soxuldular;* **3**) *amer.* məcbur/vadar etmək; **to ~** *smb.* **into doing** *smth.* bir kəsi bir iş görməyə məcbur etmək; **to ~ out** sıxışdırıb çıxartmaq, sıxışdırıb aradan çıxartmaq; *I tried to get in but I was crowded out Mən içəri girməyə çalışdım, lakin məni sıxışdırıb çıxartdılar;* **to ~ through** itələyərək içəri girmək, soxulmaq; **to ~ through a gate** darvazanı itələyib içəri girmək; **to ~ together** yığışmaq, toplaşmaq, doluşmaq; *We were standing crowded together before the picture Biz toplaşıb şəklin qabağında dayanmışdıq;* **to ~ upon** bürümək, çulğamaq; canlanmaq; *Suspicions and alarms crowded upon me Şübhələr və narahatlıqlar məni çulğadı; Memories crowded in upon me Xəyalımda xatirələr canlandı*

**crowded** ['kraudıd] *adj* **1**. ağzına qədər dolmuş; qədərindən artıq doldurulmuş; ağzınacan dolu, dopdolu; **a ~ hall** ağzına qədər dolu zal; **a ~ bus** ağzına qədər dolu avtobus; **~ streets** dolu küçələr; **~ rooms** dopdolu/ağzına qədər dolu otaqlar; *Our bus was crowded Bizim avtobus ağzına qədər dolu idi;* **2**. dar; *The horses were too crowded in one small stable Atların yeri balaca bir tövlədə çox dar idi;* **3**. dolu, doldurulmuş; **a life ~ with adventure** macəra ilə dolu həyat

**crown**[1] [kraun] *n* **1**. tac; taxt-tac *(hakimiyyət mənasında);* **to succeed to the ~** taxt-tacı irsən ələ almaq, taxt-taca irsən sahib olmaq; **to relinquish the ~** taxt-tacdan imtina etmək; **2**. çələng; əklil; **3**. halə *(göy cisimləri ətrafında görə görünən işıq dairəsi);* **4**. padşah hakimiyyəti, ali hakimiyyət; **the demise of the ~** kralın ölümü; **5**. kəllə, təpə, baş *(bir şeydə);* **the ~ of a tree** ağacın kəlləsi / təpəsi; **from toe to ~** başdan ayağa qədər; **to break** *smb.'s* **~** bir kəsin başını yarmaq, bir kəsin kəlləsini dağıtmaq; **6**. pipik *(quşda);* **7**. son hədd, bir şeyin ən yüksək zirvəsi; **the ~ of** *one's* **labour** bir kəsin zəhmətinin ən yüksək zirvəsi; **the ~ of the year** payız, xəzan *(yəni məhsul mövsümü, zəhmətin nəticəsinin son həddi);* **8**. koronka *(dişə taxılan metal qapaq)*

**crown**[2] [kraun] *v* **1**. tac qoymaq; **2**. çələng/əklil qoymaq; **to be ~ed** tac qoyulmaq, hakimiyyətə gətirilmək; **3**. mükafatlandırmaq, mükafat vermək, təltif etmək; **to ~** *smb.* **with glory** bir kəsi şöhrətləndirmək; **4**. dişə koronka qoymaq; **5**. *jarq.* başına vurmaq/zərbə endirmək

**crowned** ['kraund] *adj* **1**. tac qoyulmuş, tac qoymuş; **~ head** padşah, hökmdar; **2**. çələng qoyulmuş; mükafatlandırılmış; təltif edilmiş; **3**. bitmiş, bitirilmiş, tamamlanmış, tamamlandırılmış; **4**.: **~ tooth** koronka qoyulmuş diş

**crown law** ['kraunlɔ:] *n* cinayət qanunu

**crown lawyer** ['kraun.lɔ:jə'] *n* cinayət işləri üzrə vəkil

**crucial** ['kru:ʃəl] *adj* **1**. həlledici, həll edən; əsas, ən mühüm, başlıca; **~ test** əsas test; **~ experiment** həlledici təcrübə; **~ question** əsas/başlıca məsələ; **2**. kritik; böhranlı; **~ period/moment** kritik dövr/an; **3**. *anat.* xaçşəkilli, xaçaoxşar, xaçvarı; **~ incision** xaçşəkilli/xaçaoxşar/xaçvarı kəsik

**crucifix** ['kru:sıfıks] *n* çarmıxa çəkmə; çarmıx

**crucifixion** [.kru:siə'fıkʃn] *n* **1**. xaç üstündə çarmıxa çəkmə; **2**. **the Crucifixion** İsanın çarmıxa çəkilməsi; **3**. əzab, əzab-əziyyət, məşəqqət, müsibət

**cruciform** ['kru:sıfɔ:m] *adj* xaçvarı, xaçaoxşar, xaçabənzər, xaç formasında

**crucify** ['kru:sıfaı] *v (pt, pp* **-fied***)* **1**. çarmıxa çəkmək; **2**. söndürmək, yatırmaq *(arzunu, ehtirası və s.);* **3**. əzab / əziyyət vermək

**crude** [kru:d] *adj* **(-r, -st) 1**. təmizlənməmiş, xam, işlənməmiş; **~ spirit** təmizlənməmiş spirt; **~ oil** xam/təmizlənməmiş neft; **~ materials** xammal; **2**. lazımınca işlənməmiş/ düşünülməmiş; **~ plan/scheme** lazımınca düşünülməmiş plan /layihə; **~ theories/methods** lazımınca düşünülməmiş nəzəriyyələr / metodlar; **3**. kobud, yonulmamış, ədəbsiz, qaba; **~ people** kobud/qaba adamlar; **~ behaviour** qaba/kobud/ədəbsiz davranış; *He told us some rather crude jokes O bizə bir neçə ədəbsiz lətifə danışdı;* **4**. çılpaq, yalan, açıq; quru; **~ facts** quru dəlillər; **5**. *d.d.* yetişməmiş, kal, dəyməmiş, turş; **~ fruit** dəyməmiş / yetişməmiş / kal meyvə

**crudeness** ['kru:dnıs] *n* **= crudity**

**crudity** ['kru:dıtı] *n* **1**. işlənməmə, pis işlənmə, lazımınca işlənməmə; xamlıq; **2**. lazımınca / ətraflı düşünülməmə; **3**. kobudluq, qabalıq, sərtlik; ədəbsizlik, nəzakətsizlik, ədəbsiz hərəkət; *The crudity of his language offended the girl Onun kobud danışığı (dilinin kobudluğu) qızın xatirinə dəydi;* **4**. *tib.* həzm etməmə

**cruel** ['kruəl] *adj* **(-ler, -lest) 1**. rəhmsiz, amansız, insafsız, qəddar, zalım, daşürəkli; **a ~ dictator** amansız/insafsız/ qəddar / zalım / daşürəkli diktator; **a ~ master** rəhmsiz/insafsız/daşürəkli sahibkar; **~ fate** amansız tale; *The cruel master beat his slaves mercilessly with a whip Zalım/ Daşürəkli sahibkar qullarını qamçı ilə amansızcasına döydü; Don't be cruel to animals Heyvanlara qarşı amansız olma/ olmayın;* **2**. əziyyətli, əzablı, əzab-əziyyət verən; **~ disease** əzab-əziyyətli xəstəlik; **3**. dəhşətli, qorxunc, müdhiş; **~ suffering** dəhşətli / müdhiş əzab; **~ war** dəhşətli müharibə; **~ and unusual punishment** dəhşətli və qeyri-adi cəza; **~ cold** dəhşətli soyuq

**cruelly** ['kru:əlı] *adv* **1**. rəhmsizcəsinə, amansızcasına, insafsızcasına; acımadan; vicdansızcasına; **2**. əziyyətlə, əzabla

**cruelty** ['kruəltı] *n* **1**. rəhmsizlik, amansızlıq, qəddarlıq, zalımlıq, daşürəklilik; **cruelties of war** müharibənin amansızlıqları; **~ to animals** heyvanlara qarşı amansızlıq/qəddarlıq; **his ~ to his children** onun uşaqlarına qarşı amansızlığı / qəddarlığı; **2**. sərtlik, şiddət, ağırlıq; **the ~ of fate** taleyin sərtliyi; **the cruelties of life** həyatın amansızlığı

**cruet** ['kru:ıt] *n* duz, istiot, sirkə, xardal və s. üçün qab dəsti

**cruise**[1] [kru:z] *n* dəniz səyahəti; **round-the-world ~** dövr-aləm səyahəti *(dənizlə)*

**cruise**[2] [kru:z] *v* **1**. üzmək, müəyyən marşrut üzrə üzmək; **2**. reysə çıxmaq; **3**. kef / istirahət məqsədilə səyahət etmək

**cruiser** ['kru:zə'] *n* **1**. kreyser *(yüksək sürətli böyük hərbi gəmi);* **2**. dəniz səyahətinə çıxan gəmi; **3**. dənizlə səyahətə çıxan adam; **4**. sürətli/sürətlə gedən / iti gedən tank; **5**. *hərb.* uzaqvuran raket

**crumb**[1] [krʌm] *n* **1**. zərrəcik, cüzi miqdar; **2**. qırıntı *(xüs. çörək qırıntısı); Sweep up the crumbs from under the table Stolun altından çörək qırıntılarını süpür/süpürün;* **3**. zərrə; **~s of knowledge** biliyin zərrələri; **~s of comfort** ən az/minimal rahatlıq; *I failed my exam and my only crumb of comfort is that I can take it again Mən imtahandan kəsildim və məni zərrə qədər də olsa rahatlaşdıran odur ki, mən yenidən imtahan verə bilərəm*

**crumb**[2] [krʌm] *v* **1**. ufalamaq, doğramaq, xırda-xırda doğramaq, ovub tökmək; ufalayıb tökmək; **2**. üstünə qırıntı səpmək; **3**. *d.d.* qırıntıları süpürmək / təmizləmək; **to ~ the table** stoldan qırıntıları süpürmək

**crumb-brush** ['krʌmbrʌʃ] *n* qırıntıları yığmaq üçün şotka

**crumble** ['krʌmbl] *v* **1**. xırda-xırda doğramaq, xırdalamaq; döymək, əzmək *(həvəngdə);* ovxalamaq, toz halına salmaq; **to ~ bread** çörəyi ovxalamaq/xırda-xırda doğramaq; *He crumbled the bread O, çörəyi ovxaladı;* **2**. ovulmaq; uçmaq, sökülmək, tökülmək, uçub dağılmaq /sökülmək; *As the years passed, the old church crumbled İllər keçdikcə köhnə kilsə sökülüb dağıldı;* **3**. dağılmaq, uçmaq, məhv etmək/olmaq; *The great empires of the past have crumbled and fallen Keçmişin böyük imperiyaları uçub dağılıb və məhv olub; My dearest hopes have crumbled Mənim ən əziz ümidlərim məhv olub*

**crumbling** ['krʌmblıŋ] *adj* **1**. ovulan, ovulub tökülən; ufalanan, uçan, uçub tökülən; sökülən, sökülüb tökülən; **~ walls** sökülüb tökülən divarlar; **2**. kəsəkli, nahamar, dübür-dübür, düyür-düyür

**crumbly** ['krʌmblı] *adj* **1**. ovulan, ovxalanan; kövrək, tez ovulan; **~ bread** ovulan / tez ovulan çörək; **2**. boş *(torpaq haq.);* **~ soil** xırda kəsəkli/yumşaq/boş torpaq

**crump**[1] [krʌmp] *n* **1**. xırtıltı/xırçıltı səsi; **2**. *d.d.* ağır zərbə; **3**. *hərb. jarq.* ağır partlayıcı mərmi; ağır mərminin partlama səsi

**crump**[2] [krʌmp] *v* **1**. xırtıldamaq, xırçıldamaq; **2**. *d.d.* ağır zərbə endirmək; **3**. ağır mərmi ilə atəşə tutmaq

**crumple**[1] ['krʌmpl] *n* bürüşük, bürüş, qırış

**crumple**[2] ['krʌmpl] *v* **1**. bürüşdürmək, qırışdırmaq, əzmək; **to ~** *one's* **clothes** paltarını qırışdırmaq/bürüşdürmək/əzmək; **2**. əzilmək, bürüşmək, qırışmaq; *This cloth crumples easily*

*Bu parça asanlıqla /tez əzilir;* 3. *(həm də* **to ~ up)** büküşdürmək, bürmələmək, tapdalamaq, tapdalayıb korlamaq, əlində əzmək; **to ~ up a piece of paper** bir parça kağızı bürmələmək; *He crumpled the paper into a ball O, kağızı top kimi bürmələdi;* 4. qırmaq, sındırmaq *(müqaviməti),* darmadağın etmək; **to ~ up an opposing army** düşmən ordusunun müqavimətini sındırmaq; 5. *(həm də* **to ~ up)** uçmaq, uçub dağılmaq/tökülmək; *The walls crumpled up Divarlar sökülüb dağıldı/uçdu;* 6. ruhdan düşmək, kefi/əvqatı korlanmaq; sarsılmaq; *He crumpled up under the shocking news O, dəhşətli xəbərdən sarsıldı*

**crunch[1]** [krʌntʃ] *n* xırtıltı, xışıltı; cığıltı, cırıltı; cır-cır səsi

**crunch[2]** [krʌntʃ] *v* **1.** xırta-xırtla/xırta-xırçla / xırtıltı ilə /xırçıltı ilə yemək; *The dog was crunching a bone İt sümüyü xırtaxırtla / xırtıltı ilə yeyirdi;* **to ~ biscuits** quru peçenye yemək; 2. xırçıldatmaq, xırçıldamaq *(diş və s. haq.); Our feet crunched the gravel Çınqıl bizim ayağımızın altında xırtıldayırdı; The snow crunched the wheels Qar təkərlərin altında xırtıldayırdı*

**crunchy** [ˈkrʌntʃɪ] *adj* 1. kövrək, tezsınan; **~ biscuits** kövrək peçenye; 2. xırtıldayan; **~ snow** xırtıldayan qar

**crusade[1]** [kru:ˈseɪd] *n* **1.** *tar.* səlib müharibələri *(XI-XIII əsrlərdə qərb rıtsarlarının şərqə yürüşləri);* 2. müdafiə kampaniyası *(bir şeyi müdafiə etmək üçün);* **peace ~** sülhü müdafiə yürüşü; 3. mübarizə, kampaniya; **a ~ against corruption** korrupsiyaya qarşı kampaniya / mübarizə; **temperance ~** alkoholizm əleyhinə mübarizə kampaniyası

**crusade[2]** [kru:ˈseɪd] *v* **1.** səlib yürüşündə iştirak etmək; 2. kampaniya aparmaq, mübarizə etmək/aparmaq *(bir kəsə/şeyə qarşı)*

**crusader** [kru:ˈseɪdəʳ] *n* **1.** əhl-səlib *(səlib müharibəsində iştirak edən adam);* 2. ictimai kampaniyada iştirak edən *(adam);* **a ~ against world hunger** dünya aclığına qarşı mübarizə edən / kampaniya aparan adam

**crush[1]** [krʌʃ] *n* **1.** əzilmə, əzmə; çaxnaşma, vəlvələ, həyəcan, təşviş; parçalanma, parçalama; xırdalanma, xırdalama, doğranma, doğrama; 2. meyvə şirəsi; **lemon ~** limon şirəsi; 3. basabas, basırıq, tünlük; *I couldn't get through the crush Mən tünlükdən keçib gedə bilmədim;* 4. *d.d.* iclas, yığıncaq, böyük cəmiyyət; 5. qəbul *(qonaqları);* 6. dəstə *(ordu haq.);* 7. vurulma, aludə/bənd olma, vurğunluq; başını itirmə; **to have / to get a ~ on** ***smb.*** bir kəsə aludə olmaq, bir kəsə görə başını itirmək; *He has got a crush on his History teacher O öz tarix müəlliminə vurulub*

**crush[2]** [krʌʃ] *v* **1.** əzmək; sıxmaq; **to ~ grapes** üzümü əzmək / sıxmaq; *Don't crush the box, it has flowers in it Qutunu əzmə/ əzməyin, onun içində gül var; Several people were crushed to death by falling rocks Uçan qayalar bir neçə adamı ölümcül surətdə əzdi; The tree fell on the top of the car and crushed it Ağac maşının üstünə düşdü və onu əzdi;* **2.** əzilmək, büzüşmək; *The clothes were badly crushed in the suitcase Paltarlar çamadanda bərk/pis tərzdə əzilmişdi; Some synthetic materials do not crush easily Bəzi sintetik parçalar asanlıqla əzilmir/büzüşmür;* **3.** əzib xırdalamaq/toza döndərmək; *Huge hammers crush (up) the rocks Nəhəng çəkiclər qayaları əzib xırdalayır; First crush the biscuits, then mix them with the milk Əvvəlcə peçenyeni əzib xırdala / xırdalayın, sonra onu südə qat / qatın;* **4.** məğlub etmək, yatırmaq; *The rebellion was crushed by government forces Qiyam hökumət qüvvələri tərəfindən yatırıldı;* **5. (into)** basıb yerləşdirmək; *You can't crush 20 people into such a tiny room Belə balaca bir otağa 20 adamı yerləşdirmək olmaz;* **6. (out of)** sıxıb çıxarmaq; **to ~ the juice out of the orange** portağalın şirəsini sıxıb çıxarmaq; *Crush the juice out of oranges Portağalın şirəsini sıxıb çıxart / çıxardın;* **to ~ down 1)** əzmək, tapdalamaq, tapdalayıb əzmək; **to ~ down plants** bitkiləri tapdalayıb əzmək; **2)** xırdalamaq, xırda-xırda etmək; **to ~ down stone** daşı xırdalamaq / xırda-xırda etmək; **3)** susdurmaq, yatırmaq; **to ~ down opposition** müxalifəti susdurmaq; **to ~ into** soxulmaq, doluşmaq, dürtülmək; *They all tried to crush into the front seats Onların hamısı bir-birini itələyərək qabaq oturacaqlara soxuldular (qabaq yerlərdə oturmağa çalışdılar); They all crushed into the small room Onların hamısı balaca otağa doluşdular;*

◊ **to ~ a bottle of wine** bir butulka şərab/çaxır boşaltmaq / içmək; **to ~ in the bud /in the egg** kökünü kəsmək, beşikdə boğmaq

**crushed** [krʌʃt] *adj* **1.** əzilmiş, büzülmüş; doğranmış; 2. xırdalanmış; **~ stone** xırdalanmış daş, çınqıl, qırma daş; 3. məyus, dilxor, sarsılmış, mütəəssir

**crusher** [ˈkrʌʃəʳ] *n* **1.** daşdoğrayan maşın; **2.** *d.d.* sarsıdıcı / son dərəcə heyrətləndirici/çaşdırıcı hadisə *(xəbər); The decision was a crusher on him Qərar onu sarsıtdı / çaşdırdı; What a crusher! Bu nə pis işdir / xəbərdir!*

**crushing** [ˈkrʌʃɪŋ] *adj* sarsıdıcı, məhvedici, dağıdıcı; **~ defeat** sarsıdıcı məğlubiyyət; **~ answer** məhvedici cavab; **~ sorrow** ağır dərd / kədər; **~ blow** sarsıdıcı zərbə; **a ~ look** məhvedici baxış / nəzər

**crust[1]** [krʌst] *n* **1.** qabıq *(çörəyin);* **~ of bread** çörək qabığı; *Cut the crusts off when you make sandwiches Sandviç düzəldərkən çörəyin qabığını kəs / kəsin;* 2. çörək dilimi *(xüs. nazik və quru); He'd share his last crust with you O, son*



*parça çörəyini səninlə/sizinlə bölər;* **the earth's ~** yer qabığı; 3. *tib.* qabıq, qartmaq, köz *(yarada);* 4. çanaq *(tısbağada);* zireh *(bəzi heyvanlarda);* 5. çöküntü, xılt *(şərabda);* 6. *d.d.* qaşqabaqlı / qaraqabaq / üzügülməz / qəmgin adam; 7. ədəbsizlik, qabalıq, kobudluq; həyasızlıq, abırsızlıq;

◊ **the upper ~ 1)** cəmiyyətin yuxarı qatı; 2) baş; **to earn** ***one's*** **~** bir parça çörək qazanmaq

**crust[2]** [krʌst] *v* **1.** qabıq/qartmaq/köz bağlamaq; 2. qabıqla / qartmaqla örtülmək; qartmaqlamaq; *The snow crusted over during the night Gecə qarın üstü qartmaq / qabıq bağladı;* 3. çöküntü vermək *(şərab haq.)*

**crustacean** [krʌsˈteɪʃjən] *n zool.* xərçəngkimilər

**crusted** [ˈkrʌstɪd] *adj* **1.** qartmaqlı, qabıqlı, qartmaqla örtülmüş, qartmaqlamış, köz bağlamış; 2. çöküntülü *(şərab haq.)*

**crusty** [ˈkrʌstɪ] *adj* 1. qabıqlı, qartmaqlı, qabıqla/qartmaqla örtülmüş; köz bağlamış *(yara haq.);* **a ~ loaf** qabıqlı kömbə; 2. bərk; möhkəm; 3. kilkəli *(şərab haq.);* 4. tündməcaz, əsəbi; deyingən *(adət. qoca adamlar haq.);* **a ~ old man** deyingən qoca kişi

**crutch** [krʌtʃ] *n* **1.** qoltuqağacı; **a pair of ~es** bir cüt qoltuqağacı; **to walk / to go on ~es** qoltuqağacı ilə gəzmək; *When he broke his leg he had to walk on crutches Qıçı sınanda o, qoltuqağacı ilə gəzməyə məcbur oldu;* 2. dayaq, söykənəcək, tərəfdar; ürək-dirək verən; *John was her crutch in times of sorrow Kədərli günlərdə Con ona dayaq/ürək-dirək verən olmuşdu*

**crux** [krʌks] *n* əsas mətləb, məğz, mahiyyət *(məsələnin ən vacib hissəsi); Now we come to the crux of the matter İndi biz məsələnin ən vacib hissəsinə keçirik*

**cry[1]** [kraɪ] *n (pl* **cries)** **1.** çığırtı, qışqırtı, bağırtı, yalvarış; fəryad; fəryad qoparma; **a ~ of anger /pain / fear** acıqdan / ağrıdan / qorxudan fəryad qoparma; **to be deaf to** ***smb.'s*** **cries** bir kəsin qışqırtısına/fəryadına əhəmiyyət verməmək; **to give a ~** qışqırmaq, fəryad qoparmaq; 2. ağlama, oxşama; **to have a good ~** doyunca ağlamaq, ağlayıb sakit olmaq, ağlayıb ürəyini boşaltmaq; *Don't worry about Jane. She'll be better after she's had a good cry Ceyndən narahat olma / olmayın. Ağlayıb ürəyini boşaltdıqdan sonra o sakitləşəcək;* 3. şayiə, fikir, söhbət; *The cry goes that... Şayiə gəzir ki, ..., Söhbət gedir ki,...;* 4. ictimai fikir; **a ~ of the people, popular ~** xalqın səsi; 5. heyvanların/quşların çıxartdığı səs *(məs. itin hürməsi, canavarın ulaması və s.);*

◊ **last ~** son moda /dəb; **great/much ~ and little wool** ≅ milçəkdən fil düzəltmə; **within ~ of** səs eşidiləcək məsafədə; **out of ~** *arx.* həddindən artıq, hədsiz, son dərəcə, olduqca

**cry[2]** [kraɪ] *v (pt, pp* **-cried) 1.** qışqırmaq, bağırmaq, fəryad qoparmaq; **to ~ aloud** ucadan qışqırmaq/bağırmaq, fəryad qoparmaq; *The monkeys cry shrilly when they see danger Təhlükə hiss etdikdə meymunlar fəryad qoparırlar; The little boy cried out with pain when he burnt his fingers Barmaqları yananda balaca oğlan bağırdı / fəryad qopardı;* **2.** ağlamaq, göz yaşı axıtmaq; **to ~ with pain / hunger** ağrıdan /acından ağlamaq; **to ~ for joy** sevincdən ağlamaq; *The child was crying for its mother Uşaq anası üçün/anasından ötrü ağlayırdı; She cried with grief when she heard the news of her friend's death Dostunun ölüm xəbərini eşidəndə o acı-acı ağladı;* **to ~ over** göz yaşı tökmək / axıtmaq, yas saxlamaq; **to ~ over** ***one's*** **loss** itki üçün göz yaşı axıtmaq / tökmək, itkiyə yas saxlamaq; *On the day of mother's funeral my father cried real tears for the first time in his life Anamın dəfnində atam ömründə ilk dəfə idi ki, acı göz yaşları axıdırdı;* 3. səs çıxartmaq *(heyvanlar və quşlar haq.);* 4. yalvarmaq; yalvarıb-yaxarmaq; **to ~ for quarter** aman/əfv üçün yalvarmaq, aman diləmək; **to ~ against** etiraz etmək, etiraz səsini qaldırmaq/ucaltmaq; *Reason itself does cry against it Hətta sağlam düşüncə bunun əksinədir;* **to ~ down** qışqırmaqla səsi batırmaq; *He stood up to speak but the audience cried him down O, ayağa qalxdı ki, danışsın, lakin dinləyicilər qışqıraraq onun səsini batırdı;* **to ~ for** çağırmaq, təkidlə tələb etmək; **to ~ for help** köməyə çağırmaq; *The blood of the murdered men cried for vengeance Qətlə yetirilmiş adamların qanı intiqama çağırırdı;* **to ~ out 1)** qışqırmaq, çağırmaq, bağırmaq; qışqırıb çağırmaq, haylamaq; 2) ucadan şikayət etmək / şikayətlənmək; 3) etiraz etmək, etiraz bildirmək; *The people of the country cried out against the war Ölkənin xalqı müharibəyə etiraz etdi;* 5. cırıldamaq *(əşyalar haq.);*

◊ **to ~ for the moon** mümkün olmayan bir şeyi istəmək/tələb etmək; **to ~ craven** təslim olmaq, özünü məğlub hesab etmək; qorxub geri çəkilmək; **to ~ shares** öz payını tələb etmək; **to ~ shame** qəti etiraz/protest etmək; **to ~ quits** hesablaşmaq, əvəz-əvəz olmaq, haqq-hesab çəkib qurtarmaq, haqq-hesabı çürütmək; **to ~ with one eye and laugh with the other** bir gözü ilə ağlamaq, o biri gözü ilə gülmək, ikiüzlü/riyakar olmaq, qeyri-səmimi olmaq; **to ~ wolf** yalandan hay-haray/həyəcan qaldırmaq; **to ~ over spilt milk** düzəlməsi mümkün olmayan bir şey üçün kədərlənmək/qüssələnmək; *There is no use crying over spilt milk ≅ Keçənə güzəşt deyərlər, Olan oldu, keçən keçdi*

**cry-baby** [ˈkraɪ.beɪbɪ] *n d.d.* **1.** ağlağan *(uşaq),* zır-zır *(uşaq);* **2.** daim ağlayan/sızlayan/şikayət edən adam; *He is a dreadful cry-baby O, yaman şikayət edən / daim sızlayan adamdır*

**crying** [ˈkraɪɪŋ] *adj* **1.** ağlağan, ağlayan, qışqırıq-

çı; 2. biabırçı, qanqaraldıcı; görünməmiş, eşidilməmiş; yaramaz, iyrənc; ~ **shame** görünməmiş/eşidilməmiş biabırçılıq; ~ **evil** görünməmiş / eşidilməmiş pislik / yamanlıq; **to supply the ~ wants of the people** adamların ən vacib / ən zəruri ehtiyaclarını ödəmək
**crypt** [krıpt] *n* sərdabə *(dəfn yeri)*
**crystal¹** ['krıstl] *n* 1. kristal *(bərk cisim)*; 2. büllur *(təmizlik, saflıq rəmzi)*; **as clear as ~** büllur kimi təmiz / şəffaf; 3. büllur; büllur qab-qacaq
**crystal²** ['krıstl] *adj* 1. kristal, bülluri; 2. büllur; **a ~ bracelet** büllur qolbaq; **a ~ vase** büllur vaza; **a ~ chandelier** büllur çilçıraq; 3. təmiz, şəffaf, bülluri; ~ **stream** şəffaf axın, kiçik çay
**crystal-clear** [krıstl'klıə] *adj* büllur kimi təmiz, şəffaf
**crystallize, -ise** ['krıstəlaız] *v* 1. kristallaşdırmaq, büllurlaşdırmaq; 2. kristallaşmaq, büllurlaşmaq; 3. *kim.* kristala çevrilmək; müəyyən forma kəsb etmək; *His vague ideas crystallized into a definite plan Onun qeyri-müəyyən fikirləri müəyyən plan şəklini aldı;* 4. xarlandırmaq, şəkərləşdirmək
**crystallized, -ised** ['krıstəlaızd] *adj* 1. kristallaşdırılmış, büllurlaşdırılmış; kristallaşmış, büllurlaşmış; 2. xarlanmış; şəkərli; ~ **jam** xarlanmış mürəbbə; ~ **fruit** şəkərli meyvə
**crystallography** [.krıstə'lɔgrəfı] *n* kristalloqrafiya *(kristalların quruluşundan və formalarından bəhs edən elm)*
**cub¹** [kʌb] *n* 1. bala *(heyvanların)*; 2. *zaraf. kin.* uşaq, körpə *(təcrübəsiz mənasında)*, tərbiyə görməmiş gənc; 3. *amer. d.d.* xam, təcrübəsiz, naşı *(adam)*
**cub²** [kʌb] *v* 1. doğmaq, balalamaq, küçükləmək *(it)*, çoşkalamaq *(donuz)*; kürü tökmək *(balıq)*; 2. tülkü ovlamaq
**Cuban¹** ['kju:bən] *n* kubalı
**Cuban¹** ['kju:bən] *adj* Kuba
**cubbing** ['kʌbıŋ] *n* tülkü ovu
**cubish** ['kʌbıʃ] *adj* 1. yöndəmsiz, təhərsiz, biçimsiz, yaraşıqsız; 2. pis tərbiyə görmüş / olunmuş
**cube¹** [kju:b] *n* 1. *riyaz.* kub; 2. kub
**cube²** [kju:b] *v* 1. *riyaz.* kuba yüksəltmək; 2. kubaturasını hesablamaq; 3. kub formasında kəsmək; **to ~ ice** buzu kub formasında doğramaq / kəsmək
**cubic** ['kju:bık] *adj* kubik, kub; ~ **metre** kub metr
**cubiform** ['kju:bıfɔ:m] *adj* kubvarı, kubaoxşar, kubşəkilli, kubvarı
**cuboid** ['kju:bɔıd] *adj* kubşəkilli, kubaoxşar
**cuckold¹** ['kʌkəld] *n* dəyyus, qurumsaq *(arvadı tərəfindən aldadılan ər)*
**cuckold²** ['kʌkəld] *v* xəyanət etmək *(ərinə)*
**cuckoo** ['kuku:] *n* 1. *zool.* ququ quşu; 2. ququldama; 3. səfeh, sarsaq, ağılsız, gic, axmaq
**cucumber** ['kju:kəmbə'] *n bot.* xiyar; **fresh** ~ təzə/tər xiyar; **pickled** ~ duza qoyulmuş xiyar; *Slice the cucumber thinly Xiyarı nazik doğra / doğrayın;*

◊ **cool as a ~** sakit, soyuqqanlı, özünü itirməyən, təmkinli
**cud** [kʌd] *n* 1. gövşəmə; 2. saqqız; **to chew the ~** 1) saqqız çeynəmək; 2) çürükçülük etmək, çeynəmək
**cuddle¹** ['kʌdl] *n* qucaq, ağuş; *As soon as I opened the door my little daughter ran up to me for a cuddle Mən qapını açan kimi balaca qızım qucağıma / ağuşuma atıldı*
**cuddle²** ['kʌdl] *v* 1. qucaqlamaq, ağuşuna /qucağına almaq, ağuşuna / qucağına sıxmaq; **to ~ a baby in *one's* arms** uşağı ağuşuna / qucağına almaq; 2. qucaqlaşmaq, bir-birini qucaqlamaq; *They cuddled up / together under the blanket Onlar yorğanın altında qucaqlaşdılar*
**cuddle-bunny** ['kʌdl.bʌnı] *n jarq.* kiçikyaşlı fahişə / qəhbə
**cudgel¹** ['kʌdʒəl] *n* dəyənək, kötək;
◊ **to take up the ~s for *smb./smth.*** bir kəsi/bir şeyi müdafiə etmək, bir kəsin/bir şeyin müdafiəsinə qalxmaq; *He took up the cudgels for women's rights O, qadın hüquqlarını müdafiəsinə qalxdı*
**cudgel²** ['kʌdʒəl] *v* (-ll-) kötəkləmək, dəyənəkləmək, dəyənəklə vurmaq/döymək; *He had been cudgelled to death Onu dəyənəklə ölümcül surətdə döymüşdülər;*
◊ **to ~ *one's* brains** başını sındırmaq; *Though we cudgelled our brains for hours, the crossword finally defeated us Biz saatlarla baş sındırmağımıza baxmayaraq, krossvordu həll edə bilmədik*
**cue** [kju:] *n* I 1. *teatr.* replika *(pyesin gedişində danışan aktyorun cümləsinin son sözləri)*; **to miss *one's* ~** replikanı eşitməmək; 2. işarə, eyham; him; **to take *one's* ~ from *smb.*** bir kəsin eyhamını başa düşmək; **to give *smb.* a ~** bir kəsə işarə vermək/eyham vurmaq; *The conductor will cue you in when it's your turn to sing Dirijor sənin/sizin nə zaman oxumaq növbən/növbəniz olduğuna işarə verəcək*
**cue** [kju:] *n* II kiy *(bilyard ağacı)*
**cueist** ['kju:ıst] *n d.d.* bilyard oynayan
**cuff¹** [kʌf] *n* I 1. manjet *(paltar qolunun qatlanmış hissəsi)*; 2. *amer.* şalvarın ayağında bükük / qatlama
**cuff** [kʌf] *n* II *kin.* qoca, xəsis/simic/zıqqı qoca
**cuff** [kʌf] *n* III 1. zərbə *(xüs. əllə başa)*; 2. sillə, şillə, şapalaq; **to be at ~s** şilləşmək, dalaşmaq, vuruşmaq
**cuff²** [kʌf] *v* I qandallamaq, qandal vurmaq
**cuff** [kʌf] *v* II silləmək, əllə vurmaq, zərbə endirmək
**cuffer** ['kʌfə'] *n* boksçu
**cuff-link** ['kʌflıŋk] *n* zaponka *(kişi köynəyinin qollarına, yaxalığına taxılan düymə)*
**cuisine** [kwı:'zı:n] *n fr.* mətbəx; aşpazlıq sənəti
**culch** [kʌltʃ] *n* zibil, tullantı, tör-töküntü



**culinary** ['kʌlınərı] *adj* 1. aşpazlıq, mətbəx; xörək; ~ **skills** aşpazlıq məharəti/bacarığı; 2. bişirilməyə yararlı olan *(tərəvəz haq.)*
**culminate** ['kʌlmıneıt] *v* 1. ən yüksək nöqtəyə çatmaq; başa çatdırılmaq, tamamlanmaq; *The battle culminated in total victory Döyüş tam qələbə ilə başa çatdı;* 2. *astr.* meridiandan keçmək *(göy cismi haq.)*
**culmination** [.kʌlmı'neıʃn] *n* 1. ən yüksək nöqtə; başa çatma, tamamlanma; 2. *astr.* meridiandan keçmə, kulminasiya *(göy cisminin meridiandan keçməsi)*; 3. *astr.* zenit *(müşahidəçinin başı üstündə təsəvvür edilən ən uca xəyali nöqtə)*
**culpability** [.kʌlpə'bılıtı] *n hüq.* təqsir, günahkarlıq, müqəssirlik
**culpable** ['kʌlpəbl] *adj* təqsirli, müqəssir, günahkar, cəzaya layiq; ~ **of punishment / of death** cəzaya / ölümə layiq; **to hold *smb.* ~** bir kəsi cəzaya layiq hesab etmək, bir kəsi günahkar hesab etmək
**culpableness** ['kʌlpəblnıs] *n* = **culpability**
**culprit** ['kʌlprıt] *n* 1. cinayətkar, cani; 2. *hüq.* müttəhim, müqəssir
**cult** [kʌlt] *n* 1. kult; ayin, ibadət, sitayiş; **the ~ of Apollon** Apollona sitayiş, Apollonun kultu; 2. dini mərasim; 3. *məc.* sitayiş / ibadət etmə, ilahiləşdirmə; **to make a ~ of *smth.*** bir şeyi kulta çevirmək/ ilahiləşdirmək; **the ~ of personality/of the individual** şəxsiyyətə pərəstiş
**cultivable** ['kʌltıvəbl] *adj* 1. becərməyə yararlı *(bitki haq.)*; 2. əkinə yararlı/yarayan *(torpaq haq.)*; ~ **land / soil** əkinə yararlı torpaq/yer
**cultivate** ['kʌltıveıt] *v* 1. şumlamaq, sürmək, əkmək *(yeri)*; 2. yetişdirmək, becərmək *(torpağı, bitkini)*; 3. inkişaf etdirmək, yaxşılaşdırmaq, təkmilləşdirmək; **to ~ the mind** ağlı/dərrakəni inkişaf etdirmək; 4. nail olmaq *(dostluğa və s.)*; **to ~ *smb.'s* friendship / acquaintance** bir kəslə dostluğa/tanışlığa nail olmaq; *John always tries to cultivate people who are useful to him Con ona faydalı olan adamlarla həmişə dostluğa nail olmağa çalışır; You must cultivate people who can help you in business Sən biznesdə sənə kömək edə biləcək adamlarla dost olmalısan / olmalısınız*
**cultivated** ['kʌltıveıtıd] *adj* 1. *k.t.* becərilmiş; becərilən; ~ **land** becərilmiş torpaq; 2. mədəni; ~ **plants** mədəni bitkilər; 3. mədəni, inkişaf etmiş; ~ **man** mədəni / inkişaf etmiş adam; ~ **taste** inkişaf etmiş /zərif zövq; **a ~ young woman** gənc mədəni qadın
**cultivation** [.kʌltı'veıʃn] *n* 1. becərilmə *(torpaq haq.)*; yetişdirmə; **the ~ of the soil** torpağın becərilməsi; **the ~ of roses** qızılgül yetişdirməsi; **land that is under ~** becərilən torpaq; **field in / under ~** becərilən sahə; *The field has been under cultivation for many years Bu sahə uzun illərdir ki, becərilir;* 2. inkişaf etdirmə; ~ **of the mind** ağlın / zəkanın inkişafı
**cultivator** ['kʌltıveıtə'] *n* 1. əkinçi; 2. *k.t.* kultivator *(torpaqbecərən maşın)*
**cultural** ['kʌltʃərəl] *adj* 1. mədəni, mədəniyyət; ~ **centre** mədəniyyət evi/mərkəzi; ~ **achievements** mədəni sahədə əldə edilmiş nailiyyətlər; 2. becərilən; süni yolla yetişdirilmiş
**culture¹** ['kʌltʃə'] *n* 1. mədəniyyət; **Greek ~** yunan mədəniyyəti; **a period of high / low ~** yüksək/alçaq mədəniyyət dövrü; **a society without much ~** mədəniyyətcə kasıb cəmiyyət; *Universities should be centres of culture Universitetlər mədəniyyət mərkəzi olmalıdır;* **Western ~** qərb mədəniyyəti; **working-class ~** fəhlə sinfinin mədəniyyəti; *She is a woman of considerable culture O, çox böyük mədəniyyətə malik olan bir qadındır;* 2. inkişaf etdirmə; *The culture of mind is vital Ağlın / Zəkanın inkişaf etdirilməsi həyati əhəmiyyət kəsb edir;* 3. becərmə; ~ **of silk/of cotton** ipək/pambıq becərmə; 4. yetişdirmə, saxlama *(arı, balıq, baramaqurdu və s.)*
**culture²** ['kʌltʃə'] *v* 1. becərmək; yetişdirmək; 2. inkişaf etdirmək, təkmilləşdirmək
**cultured** ['kʌltʃəd] *adj* 1. mədəni, savadlı, inkişaf etmiş; **a ~ mind** inkişaf etmiş zəka; 2. insan tərəfindən süni yolla yetişdirilmiş / düzəldilmiş /istehsal edilmiş; ~ **pearl** süni mirvari; ~ **mushrooms** süni yolla yetişdirilmiş şampinyon *(yeməli göbələk növü)*
**culver** ['kʌlvə'] *n zool.* çöl göyərçini
**cumber¹** ['kʌmbə'] *n* çətinlik, maneə, əngəl; çətin / ağır vəziyyət
**cumber²** ['kʌmbə'] *v* çətinləşdirmək; çətinliyə /çətin vəziyyətə/çətinə salmaq; sıxıntı vermək, sıxışdırmaq, maneə/əngəl törətmək
**cumbersome** ['kʌmbəsəm] *adj* 1. ağır, yekə; **the ~ old table** ağır/yekə köhnə stol; ~ **armour** ağır zirehli; **a ~ box** ağır qutu; 2. ağır zəhmətli, məşəqqətli, yorucu; ~ **ceremonies** məşəqqətli / yorucu mərasimlər
**cumbrous** ['kʌmbrəs] *adj* = **cumbersome**
**cummerbund** ['kʌməbʌnd] *n* qurşaq, belbağı *(Hindistanda)*
**cumulate¹** ['kju:mjulıt] *adj* bir yerə toplanmış
**cumulate²** ['kju:mjuleıt] *v* bir yerə yığmaq / toplamaq; **to ~ proofs** *hüq.* sübutları / dəlilləri bir yerə yığmaq
**cumulation** [.kju:mju'leıʃn] *n* 1. yığma, toplama; yığılma, toplanma; 2. *tib.* kumulyasiya *(orqanizmdə dərman maddələrinin və ya zəhərlərin toplanması)*; 3. *hüq.* bir neçə iddianın bir yerə toplanması
**cumulative** ['kju:mjulətıv] *adj* yığılmış, toplanmış; birgə, birləşmiş, müştərək; ~ **evidence / proof** toplanmış sübutlar / dəlillər
**cunning¹** ['kʌnıŋ] *n* 1. hiyləgərlik, biclik, hiylə, fənd, məkr, tülkülük; **to play ~** *d.d.* biclik / hiy-

ləgərlik etmək, hiylə / biclik / fənd işlətmək; 2. *arx.* bacarıq, qabiliyyət, məharət; cəldlik, zireklik, ustalıq, çeviklik

**cunning[2]** ['kʌnɪŋ] *adj* 1. hiyləgər, xain, məkrli, şeytan, iblis, kələkbaz, bic, fəndgir; **as ~ as a fox** tülkü kimi bic; 2. *arx.* bacarıqlı, məharətli, zirək, cəld, çevik; 3. *amer. d.d.* qəşəng, çox gözəl, füsunkar, məlahətli, cazibəli; maraqlı, maraq oyadan; **a ~ smile** cazibədar / füsunkar / məlahətli təbəssüm; **a ~ little girl** qəşəng / çox gözəl / məlahətli / cazibəli balaca qız; **a ~ baby** qəşəng uşaq

**cunningly** ['kʌnɪŋlɪ] *adv* cəld, bacarıqla, məharətlə, hiyləgərliklə, hiylə ilə, bicliklə

**cunt** [kʌnt] *n tab.* 1. qadının cinsi orqanı; 2. gicbəsər, gicdıllaq; *You stupid cunt! Ay gicdıllaq!*

**cup[1]** [kʌp] *n* 1. fincan, kasa; **china ~s and saucers** çini fincanlar və nəlbəkilər; **a ~ of tea** bir fincan çay; 2. cam; badə; qədəh, piyalə; **to drink the parting ~** ayrılıq badəsi içmək; 3. *id.* kubok; **challenge ~** keçici kubok; **to win the ~** kuboku udmaq; 4. şərab; **to be fond of the ~** içməyi sevmək; 5. tale, pay, qismət; 6. *bot.* qaymaqçiçəyi; ◊ ***one's ~ of tea*** həvəs, şövq, meyl, maraq; *He is not my cup of tea O mənim istəyimə uyğun adam deyil;* **to fill up the ~, to make the ~ run over** səbrini tükəndirmək, səbr kasasını doldurmaq; **to kiss the ~** 1) dadmaq, dodağına vurmaq, azca içmək; 2) içmək; **to be in *one's* ~s** kefdə-damaqda olmaq, kef etmək; **to be a ~ too low** dilxor olmaq, kefi pozulmaq / olmamaq; kefi aşağı olmaq; *His cup of happiness/of misery is full Onun xoşbəxtliyi/bədbəxtliyi həddən artıqdır; There's many a slip between the cup and the lip at. söz. ≅ Ölüm qaşla göz arasındadır*

**cup[2]** [kʌp] *v* (-pp-) 1. fincan formasına salmaq; *He cupped his hands round his mouth and shouted O, əllərini ağzında fincan şəklində girdələyərək qışqırdı;* 2. ovuc; **to hold berries in *one's* ~ped hands** giləmeyvəni ovcunda tutmaq/ saxlamaq; **to ~ *one's* chin in *one's* hands** çənəsini ovcu içinə almaq; 3. *tib.* banka /küpə salmaq

**cupboard** ['kʌbəd] *n* 1. şkaf, dolab; divar şkafı; 2. anbarça, kiçik / balaca anbar

**cupboard-love** ['kʌbədlʌv] *n* məqsədli məhəbbət/istək *(xüs. uşaqlarda); It's only cupboard-love - he wants you to give him some sweet Bu, süni istəkdir, o istəyir ki, sən/siz ona bir az konfet verəsən/verəsiniz*

**cupful** ['kʌpful] *n* (*pl* **cupfuls**) fincan/ cam dolusu; **three ~s of water** üç fincan dolusu su

**Cupid** ['kju:pɪd] *n əs.* Kupidon *(qədim Yunanıstanda məhəbbət allahı)*

**cupidity** [kju:'pɪdətɪ] *n* 1. tamahkarlıq, acgözlük, gözüdoymazlıq, tamah; hərislik, simiclik; 2. *arx.* bərk istəmə, şiddətli arzu, ehtiras, şəhvət

**cupola** ['kju:pələ] *n* 1. günbəz, qübbə; 2. *d.d.* təpə

**cupped** [kʌpt] *adj* kasavarı, fincanvarı, fincanaoxşar, fincanabənzər, fincanşəkilli

**cupping** ['kʌpɪŋ] *n tib.* bankalama, banka qoyma, küpə salma

**cupping-glass** ['kʌpɪŋgla:s] *n tib.* banka

**cupreous** [kju:prɪəs] *adj* misli, tərkibində mis olan

**cur** [kə:] *n* 1. həyət iti *(xüs. sərt);* 2. tərbiyəsiz / kobud adam

**curable** ['kjuərəbl] *adj* müalicə oluna / sağala bilən, müalicəsi mümkün olan

**curate** ['kjuənt] *n* keşiş; vikari *(yepiskop müavini)*

**curative** ['kjuərətɪv] *adj* 1. müalicəvi; tibbi; şəfaverici, şəfalı; sağaldıcı; **~ value of sunshine** günəş şüasının müalicəvi / şəfaverici xassəsi; 2. islahedici, düzəldici

**curator** [kjuə'reɪtə'] *n* 1. muzeyi / kitabxananı və s. saxlayan / mühafizə edən / qoruyan; 2. kurator, universitetin idarə heyətinin üzvü

**curb[1]** [kə:b] *n* 1. yüyən, cilov; cilovlama, noxtalama; qarşısını alma; **~ to violence** zorakılığın qarşısını alma; **~ to passion** ehtirası cilovlama; **to put a ~ on *one's* anger** öz qəzəbini/acığını cilovlamaq; 2. yüyənin dodaqaltı qayçısı; 3. *bayt.* atın ayağında şiş; 4. kəsmə, kəsilmə; doğrama, doğranma *(ağac haq.);* 5. kənar, qıraq *(yol haq.)*

**curb[2]** [kə:b] *v* 1. yüyənləmək *(atı);* 2. cilovlamaq, saxlamaq, basmaq; qarşısını almaq; **to ~ *one's* temper** acığını / hirsini cilovlamaq; **to ~ *one's* tongue** dilini saxlamaq; **to ~ inflation** inflyasiyanın qarşısını almaq; 3. bordyur daşı qoymaq *(yolun kənarına)*

**curb-stone** ['kə:bstoun] *n* 1. bordyur daşı; 2. papiros / siqar kötüyü

**curd** [kə:d] *n* 1. kəsmik, şor

**curdle** ['kə:dl] *v* 1. çürütmək *(südü); Lemon juice curdles milk Lumu şirəsi südü çürüdür;* 2. dondurmaq, qatılaşdırmaq *(qanı);* 3. çürümək *(süd haq.),* qatılaşmaq, donmaq *(qan); The milk has curdled Süd çürüyüb; My blood curdled with terror Dəhşətdən qanım dondu*

**cure[1]** [kjuə'] *n* 1. dərman, çarə; üsul, yol; tədbir; **~ for a cough** öskürək dərmanı; **~ for unemployment** işsizliyi aradan qaldırmaq üçün tədbir; 2. müalicə; müalicə kursu; **to undergo a ~** müalicə kursu keçmək/qəbul etmək; **a disease beyond/past ~** müalicəolunmaz/müalicəsi/əlacı olmayan xəstəlik; **the hot water ~** isti vanna ilə müalicə

**cure[2]** [kjuə'] *v* 1. müalicə etmək, sağaltmaq; **to ~ a patient** xəstəni müalicə etmək / sağaltmaq; **to ~ a disease / a headache** xəstəliyi / başağrısını müalicə etmək; **to ~ drunkenness** sərxoşluqdan sağaltmaq; 2. uzaqlaşdırmaq *(pis adətlərdən və s.);* **to ~ *smb.* of bad habits** bir kəsin pis adətlərini uzaqlaşdırmaq; 3. hisə vermək, konservləşdirmək; duzlayıb qurutmaq; **to ~ fish** balığı hisə vermək; **to ~ bacon** donuz ətini



duzlayıb qurutmaq; 4. *tex.* vulkanizasiya etmək *(avtomobil şinlərini)*

**cureless** ['kjuəlɪs] *adj* sağalmaz, əlacsız, müalicəolunmaz, çarəsiz, çarəsi olmayan

**curfew** ['kə:fju:] *n* komendant saatı; **to impose a ~** komendant saatı qoymaq; **to list/to end a ~** komendant saatını götürmək, komendant saatına son qoymaq; *You must go out after curfew Sən/Siz komendant saatından sonra çıxıb getməlisən / getməlisiniz*

**curing** ['kjuərɪŋ] *n* 1. müalicə; 2. sağalma; 3. konservləşdirmə, konservləşdirilmə, konserv hazırlama; duzlama *(əti, balığı),* qurutma, qurudulma *(ət, balıq və s. haq.);* hisləmə, hisə vermə *(balıq, ət və s. haq.)*

**curiosity** [,kjuərɪ'ɔsɪtɪ] *n* 1. biliyə həvəs/maraq, hər şeyi öyrənmək / bilmək arzusu; **~ about unknown lands** naməlum ölkələr / torpaqlar haqqında bilik əldə etmək arzusu / həvəsi; 2. maraq, hər şeyi bilmək həvəsi / arzusu; **to burn with (a) ~** çox böyük maraq göstərmək; *The boy burned with (a) curiosity to know what was in the letter addressed to his mother Oğlan anasına ünvanlanmış məktubda nə yazıldığını bilməyə çox maraq göstərirdi;* 3. aztapılan / nadir şeylər, antikvar şeylər / əşyalar, əntiqə şeylər

**curious** ['kjuərɪəs] *adj* 1. maraqlanan, hər şeyi bilmək istəyən; hər şeylə maraqlanan; *I am curious to know what... Mənim üçün çox maraqlıdır ki,...;* 2. maraqlanan, maraq dolu; *She stole a curious look at me O, mənə maraq dolu bir nəzər saldı / yetirdi;* 3. qəribə, təəccüblü, qeyri-adi, məzəli, maraq doğuran; **a most ~ reason** çox qəribə / qeyri-adi səbəb; **~ sound** qəribə səs

**curiously** ['kjuərɪəslɪ] *adv* 1. maraqla; qəribə, təəccüblə, təəccüblü bir surətdə; 2. müstəsna dərəcədə, son / görünməmiş dərəcədə; *She is curiously ugly O çox / görünməmiş dərəcədə eybəcərdir*

**curiousness** ['kjuərɪəsnɪs] *n* 1. diqqətəlayiqlik, nadirlik; əntiqə şey; 2. zəriflik, qəşənglik, incəlik, gözəllik

**curl[1]** [kə:l] *n* 1. zülf, saç, tel; qıvrım *(saçda və s.);* 2. burma, burulma, burulmuş saç, zavivka; *My hair is out of curl Mənim saçım zavivkadan düşüb (yəni saçım buruq deyil);* 3. spiral; 4. həlqə, burum *(tüstü)*

**curl[2]** [kə:l] *v* 1. hörmək; eşmək, qatlamaq, burmaq; burdurmaq *(saçı); She has curled her hair O, saçını burdurub; He was curling his long moustache O, uzun bığlarını eşirdi;* **to ~ a hat brim** şlyapanın qıraqlarını qatlamaq / əymək; 2. burulmaq; *Her hair curls naturally Onun saçı təbii olaraq burulur;* 3. həlqələnmək, burulmaq *(tüstü və s. haq.); Volumes of smoke were curling upwards Nəhəng tüstü burumu burula-burula yuxarı qalxırdı;* 4. büzmək *(dodağı);* **to ~ *one's* lips** dodaqlarını büzmək *(narazılıq əlaməti olaraq);* **to ~ up** 1) qatlamaq; **to ~ up the corners of a book** kitabın künclərini qatlamaq; 2) qatlanmaq, büzüşmək; *The frost made the leaves curl up Şaxtadan yarpaqlar büzüşmüşdü;* 3) *d.d.* yıxılmaq; *The stone hit him on the forehead and he curled up at once Daş onun alnına dəydi və o saat/dərhal o büzüşdü;*
◊ **to make *smb.'s* hair ~** bir kəsi qorxutmaq

**curler** ['kə:lə'] *n* biqudi *(saçları burmaq üçün lülecik)*

**curly** ['kə:lɪ] *adj* 1. dalğalı, qıvrımsaç, buruqsaç; qıvrım-qıvrım; **~ hair** qıvrım-qıvrım saç; 2. əyilmiş; **a chair with ~ legs** əyilmiş qıçlı stul

**curly-headed** ['kə:lɪhedɪd] *adj* qıvrımsaç, qıvrımbaş; **a ~ girl** qıvrımsaç qız

**curly-pate** ['kə:lɪpeɪt] *n d.d.* qıvrımsaçlı / buruqsaç adam

**curmudgeon** [kə:'mʌdʒn] *n* xəsis / simic *(adam)*

**curmudgeonly[1]** [kə:'mʌdʒənlɪ] *adj* 1. xəsis, simic; 2. kobud, qaba; ədəbsiz, nəzakətsiz, mərifətsiz

**curmudgeonly[2]** [kə:'mʌdʒənlɪ] *adv* 1. həddindən artıq xəsiscəsinə; 2. kobud, qaba, kobudcasına

**curr** [kə:'] *v* 1. quruldamaq *(göyərçin haq.);* 2. mırıldamaq; xoruldamaq *(pişik haq.)*

**currant** ['kʌrənt] *n* 1. *bot.* qarağat; **black ~** qara qarağat; **red ~** qırmızı qarağat; 2. korinka *(yunan üzümü)*

**currency** ['kʌrənsɪ] *n* 1. işlənmə / yayılma dərəcəsi; **words in common ~** çoxişlənən / geniş yayılmış sözlər; **to gain / to acquire/to obtain ~** şöhrət/ad-san qazanmaq; **to give ~ to *smth.*** bir şeyi dövriyyəyə buraxmaq/yaymaq; 2. pul dövriyyəsi; 3. *mal.* valyuta, pul; **paper ~** kağız pul; **gold / silver ~** qızıl / gümüş valyuta; **foreign ~** xarici valyuta; **hard ~** 1) sərbəst konversiya edilə bilən valyuta; 2) aztapılan valyuta *(bir ölkədə);* **soft ~** konversiya edilə bilməyən valyuta; 4. davamlılığı, təsir müddəti *(bir şeyin);* **during the ~ of the contract** müqavilənin təsir müddətində

**current[1]** ['kʌrənt] *n* 1. axın; **air ~s** hava axını; **~ of warm air** isti hava axını; *The current is the strongest in the middle of the river Çayın ortasında axın lap güclüdür; The swimmer was swept away by the current Axın üzgüçünü dartıb apardı; She had to swim against the current O, axına qarşı /axının əksinə üzməli oldu;* 2. gediş, inkişaf; **the ~ of events** hadisələrin inkişafı/gedişi; **~ of thought** fikrin inkişafı; **~ of time** zamanın gedişi; 3. *fiz.* elektrik cərəyanı; **a 15 amp. ~** 15 amperlik elektrik cərəyanı;
◊ **against ~** axının əksinə, axına qarşı; **to breast the ~** axına qarşı getmək, axının əksinə getmək; axına sinə gərmək; **to go with the ~** axın istiqamətində getmək, həyatla ayaqlaşmaq

**current[2]** ['kʌrənt] *adj* 1. cari, indiki, bugünkü, hazırki; **~ month / year** cari ay /il; **the ~ issue of a magazine** jurnalın növbəti nömrəsi; ~

expenses cari xərclər; ~ price hazırki/bugünkü qiymət; ~ fashions hazırki dəblər; ~ problems bugünkü problemlər; my ~ girl friend mənim indiki /hazırki rəfiqəm; ~ events in our country vətənimizdəki cari/bugünkü hadisələr; the ~ year's account cari ilin hesabatı; 2. geniş işlənən / yayılmış; words in ~ use geniş / çox işlənən sözlər; This word is no longer in current use Bu söz artıq çox /geniş işlənmir; 3. dövriyyədə olan, işlənən; ~ coin dövriyyədə olan / işlənən sikkə / dəmir pul;

◊ ~ news/events 1) cari xəbərlər/ hadisələr; 2) xronika (qəzetdə yerli xəbərlər şöbəsi)

**currently** ['kʌrəntlı] adv indi, hazırda, hal-hazırda; our director, who is ~ in Japan bizim hal-hazırda Yaponiyada olan müdirimiz

**curricula** [kə'rıkjulə] n curriculum isminin cəm forması

**curriculum** [kə'rıkjuləm] n (pl həm də -la) 1. tədris kursu; tədris planı (məktəbdə, universitetdə və s.); 2. cədvəl

**curriculum vitae** [kə'rıkjuləm'vaıtı] n lat. tərcümeyi-hal

**currier** ['kʌrıə'] n 1. gön-dəri istehsalı ustası /fəhləsi; dabbaq; 2. mehtər, atabaxan

**currish** ['kə:rıʃ] adj qaba, kobud; ədəbsiz, nəzakətsiz; deyingən

**curry**[1] ['kʌrı] n 1. kerri (ət, balıq və ya tərəvəzdən hazırlanmış sous, xörək şirəsi); 2. üstünə kerri (sous) tökülmüş pörtlədilmiş ət

**curry**[2] ['kʌrı] v 1. qaşovla təmizləmək (atı); 2. aşılamaq (dərini); 3. döymək, vurmaq, döyəcləmək, kötəkləmək;

◊ to ~ favour with smb. bir kəsə yaltaqlanmaq, bir kəsin qarşısında yaltaqlıq etmək; qılığa girmək

**curry-comb** ['kʌrıkoum] n at təmizləmək üçün şotka, qaşov

**curse**[1] [kə:s] n 1. lənət, nifrin, qarğış; to call down / to lay ~s upon smb. bir kəsə qarğış etmək, bir kəsə lənətlər yağdırmaq; to put a ~ on smb. bir kəsi lənətləmək; The witch put a curse on him Cadugər ona lənət yağdırdı; 2. söyüş; 3. bəla, fəlakət; He's a curse to his family O, ailəsi üçün bəladır; Gambling was his curse Qumar onun fəlakəti idi; 4. tab. aybaşı; I got the curse today Mən bu gün aybaşı olmuşam;

◊ not to give a ~ for smth. bir şeylə əsla maraqlanmamaq, bir şeyə diqqət verməmək; Curses like chickens come home to roost at. söz. ≅ Özgəyə quyu qazan özü düşər

**curse**[2] [kə:s] v 1. lənətləmək, lənət oxumaq / yağdırmaq; She cursed the day she was born O doğulduğu günü lənətlədi; He cursed his bad luck O öz uğursuz taleyinə lənət oxudu / yağdırdı; 2. söyüş söymək; yamanlamaq; He cursed loudly O ucadan söyüş söydü; The man cursed his horse Kişi atını yamanladı; 3. pislik / yamanlıq etmək, pisliyə / yamanlığa bais olmaq; vermək (zərər), yetirmək (ziyan)

**cursed** ['kə:sıd] adj 1. lənətə gəlmiş, lənətlənmiş, mənhus; a ~ dog lənətə gəlmiş it; 2. nifrətəlayiq, nifrət doğuran; I wish that cursed dog would be quiet Kaş, o lənətə gəlmiş it sakitləşəydi; 3. d.d. tərs, inad, inadcıl, inadkar; a ~ boy tərs/inadcıl oğlan; 4. çox pis, iyrənc, yaramaz; What cursed weather! Nə iyrənc havadır!

**cursedly** ['kə:sıdlı] adv bərk, çox pis, son dərəcə, hədsiz; to be ~ tired bərk yorulmaq/yorğun olmaq; I felt myself cursedly Mən özümü çox pis hiss edirdim

**cursive** ['kə:sıv] adj əl ilə yazılmış

**cursorily** ['kə:sərəlı] adv ötəri, səthi, başdansovdu bir tərzdə

**cursory** ['kə:sərı] adj üzdən; səthi, yüngül; başdansovma, müxtəsər, ötəri; to get a ~ view of smth. bir şey haqqında ötəri / səthi təsəvvür əldə etmək; ~ inspection başdansovdu/ötəri yoxlama; to give a ~ glance ötəri nəzər salmaq

**curt** [kə:t] adj 1. qısa, yığcam; gödək; 2. kəsə, iti, kəskin (cavab və s.); a ~ answer qəti/kəskin cavab vermək

**curtly** ['kə:tlı] adv qısa, yığcam, qısa/yığcam/ kəskin şəkildə

**curtness** ['kə:tnıs] n qısalıq, yığcamlıq; kəskinlik, sərtlik

**curtail** [kə:'teıl] v qısaltmaq, azaltmaq, kəsmək, gödəltmək, kəsib gödəltmək; to ~ a speech / lecture nitqi/mühazirəni qısaltmaq; to ~ words sözləri qısaltmaq; to ~ smb.'s salary bir kəsin əmək haqqını kəsmək; We must try to curtail our spending Biz çalışıb xərcimizi azaltmalıyıq

**curtailment** ['kə:'teılmənt] n ixtisar etmə / edilmə / olunma, ixtisara salma, ixtisar; kəsmə, qısalma, gödəlmə

**curtain**[1] ['kə:tn] n pərdə; to draw the ~ pərdəni çəkmək/örtmək; The curtain rises/falls at eight sharp Pərdə düz səkkizdə qalxır/enir; ~ of fire hərb. atəş pərdəsi; ~ of smoke hərb. tüstü pərdəsi; The castle was hidden behind a smoke curtain Qəsr tüstü pərdəsi arxasında gizlənmişdi;

◊ The curtain rises Tamaşa başlanır; The curtain falls/drops 1) Tamaşa qurtarır; 2) Həyat qurtarır; behind the ~ pərdə arxasında; to take the ~ alqışlara cavab olaraq səhnəyə qayıtmaq; to call before the ~ çağırmaq (aktyoru)

**curtain**[2] ['kə:tn] v pərdə tutmaq/asmaq; to ~ a window pəncərəyə pərdə asmaq/tutmaq; to ~ off part of a room otağın bir hissəsini pərdə ilə ayırmaq; We can curtain off the each bed in the hospital for private examination Ayrıca müayinə aparmaq üçün biz xəstəxanada hər bir çarpayını pərdə ilə ayıra bilərik

**curtain-call** ['kə:tnkɔ:l] n aktyoru səhnəyə çağırma; to take three ~s alqışa cavab olaraq üç dəfə səhnəyə gəlmək / çıxmaq



**curtained** ['kə:tnd] adj pərdəli; ~ windows pərdəli pəncərələr

**curtain-fire** ['kə:tn.faıə'] n hərb. atəş pərdəsi

**curtsey** ['kə:tsı] n = curtsy[1,2]

**curtsy**[1] ['kə:tsı] n reverans (əyilərək salam vermə / təşəkkür etmə üsulu);

◊ to make/to drop a ~ reverans etmək; to make one's ~ to the queen saraya təqdim olunmaq

**curtsy**[2] ['kə:tsı] v reverans etmək

**curvature** ['kə:vətʃə'] n əymə, əyilmə; əyrilik, əyri / əyilmiş yer; ~ of the spine onurğanın / bel sümüyünün əyilməsi

**curve**[1] [kə:v] n 1. döngə (yolda); ~ in the road yolda döngə; 2. əyrilik, əyilmə

**curve**[2] [kə:v] v 1. əymək, bükmək, qatlamaq; to ~ the back belini əymək/bükmək; 2. əyilmək, bükülmək, qatlanmaq, dönmək; The road curved sharply to the right Yol sərt bir tərzdə sağa döndü

**curved** [kə:vd] adj 1. əyilmiş, qatlanmış, donqar; əyri; ~ nose donqar burun; a bird with a ~ beak qarmaqvarı dimdikli quş; 2. hərb. dik; ~ fire dik atəş

**curvet**[1] [kə:'vet] n 1. id. kurbet (atın qabaq ayaqlarını yığaraq sıçraması); 2. id. tullanma üsulu

**curvet**[2] [kə:'vet] v 1. kurbet etmək, atılmaq, sıçramaq (at və at sürən haq.); 2. atlanmaq, çapmaq, çaparaq getmək, səyirtmək

**cushion**[1] ['kuʃn] n 1. divan mütəkkəsi; iynə-sancaq üçün balaca yastıq; krujeva hörmək üçün balaca yastıq; 2. bilyardın bortu; 3. amer. qara gün üçün yığılmış pul; 4. tex. altlıq

**cushion**[2] ['kuʃn] v 1. tex. altlıqla təmin etmək, altlıq qoymaq; 2. yastığın üstündə oturub dincəlmək; 3. gizlətmək; əhəmiyyət verməmək, laqeyd / etinasız qalmaq; to ~ complaints şikayətə etinasız qalmaq / əhəmiyyət verməmək

**cushiony** ['kuʃənı] adj yastıqvarı, yastığaoxşar, yastıq kimi yumşaq

**custom**[1] ['kʌstəm] n 1. adət, qayda; vərdiş; international ~ beynəlxalq qayda; ~s of war müharibə qaydaları; the manners and ~s of a country ölkənin qayda və adətləri; ~ in trade ticarət qaydaları; It was a custom with him to get up early Səhər tezdən yataqdan qalxmaq onun adəti idi; 2. müştərilər; sifarişçilər; This shop draws plenty of custom Bu mağazanın çoxlu müştərisi var; 3. sifariş, bir mağazaya verilən sifariş; I shall withdraw / take away my custom from this shop Mən bundan sonra bu mağazadan heç nə almayacağam;

◊ Once is no custom ≅ Bir dəfə hesabdan deyil; Custom is second nature ≅ Adət ikinci xasiyyətdir

**custom**[2] ['kʌstəm] adj amer. sifarişlə hazırlanmış; ~ clothes sifarişlə tikilmiş paltar; ~ tailor fərdi sifarişlə paltar tikən dərzi

**customary** ['kʌstəmərı] adj adi, həmişəki, adət olunmuş/edilmiş; ~ practice adi təcrübə; at the ~ hour adi vaxtda; as is ~ adəti üzrə; It's customary to give people gifts on their birthday Ad gününü münasibətilə adamlara hədiyyə vermək adi haldır

**customer** ['kʌstəmə'] n 1. müştəri; sifarişçi; The new shop across the road has taken away most of my customers Yolun o tərəfindəki yeni mağaza mənim əksər müştərilərimi əlimdən alıb; 2. d.d. tip (hər hansı bir səciyyəvi xüsusiyyətləri ilə başqalarından fərqlənən adam); subyekt, adam, şəxs; a queer ~ şübhəli adam; a rum ~ qəribə şəxs/adam; a rough ~ qaba /kobud /ədəbsiz adam; a tough ~ 1) tərs / inadcıl adam; 2) dözümlü/möhkəm adam

**custom-house** ['kʌstəmhaus] n gömrükxana

**custom-made** ['kʌstəm'meıd] adj amer. sifarişlə hazırlanmış

**customs**[1] ['kʌstəmz] n pl gömrük rüsumu; ~ free gömrüksüz, gömrük rüsumu olmayan; to pass/to get through the ~ gömrük yoxlamasından keçmək; How long does it take to get through customs? Gömrük yoxlamasından keçmək nə qədər vaxt aparır?/alır?

**customs**[2] ['kʌstəmz] adj gömrük; ~ officer gömrükxanaçı, gömrükxana xidmətçisi; ~ check gömrük yoxlaması; ~ duty gömrük haqqı; ~ fees gömrük rüsumu / vergisi; ~ union gömrük birliyi

**cut**[1] [kʌt] n 1. kəsik; kəsmə, kəsilmə; kəsilmiş yer; a ~ on the finger barmaqda kəsik; ~s on the face after shaving taraşdan sonra üzdə kəsiklər; 2. güclü zərbə (qamçı ilə, qılıncla və s.); to make a ~ at smb. with a sword bir kəsi qılıncla yaralamaq; The boy got six cuts with a cane Əl ağacı ilə oğlana altı zərbə vurdular; to give a horse a ~ across the flank atın yanbızına qamçı ilə zərbə vurmaq; 3. kəsilmiş parça; kəsilib götürülən parça; can əti; a ~ from the joint aşp. can əti; breast ~ aşp. döş əti; 4. qırxım, yun qırxımı; kəsmə, kəsilmə (parça haq.); 5. çevrə, kontur; 6. biçim, ülgü, paltar fasonu; 7. azaltma, azalma, kəsmə; aşağı salınma / düşmə; a ~ in prices / in salary qiymətlərin / məvacibin aşağı salınması /düşməsi; 8. düz / kəsə/ən yaxın yol; to take / to make a short ~ kəsə/ən yaxın yolla getmək; 9. hücum, düşməncəsinə çıxış; təhqir etmə, təhqir, həqarət; That was a cut at me O mənə qarşı hücum / həqarət idi; 10. d.d. tanışlığı kəsmək; to give smb. the ~ direct bir kəslə tanışlığı kəsmək; 11. d.d. buraxma, iştirak etməmə (dərs, iclas haq.); Attendance was compulsory, but no cuts were allowed Davamiyyət məcburi idi, amma / lakin heç bir yayınmaya icazə verilmirdi; 12. ağac üzərində qravüra/oyma naxış; 13. d.y. açma, ayırma (vaqonu);

◊ a ~ above xeyli yaxşı/üstün; to be a ~ above one's neighbour qonşudan xeyli üstün olmaq

**cut**[2] [kʌt] adj 1. kəsilmiş; doğranmış; yaralan-

mış; ~ **finger** kəsilmiş / yaralanmış barmaq; ~ **flowers** kəsilmiş güllər / çiçəklər; ~ **nails** kəsilmiş dırnaqlar; 2. biçilmiş *(paltar haq.)*; 3. cilalanmış; yonulmuş, taraşlanmış, taraş edilmiş; ~ **glass** yonulmuş/taraşlınmış şüşə; 4. azaldılmış, aşağı endirilmiş / salınmış; ~ **prices** aşağı salınmış qiymətlər; ~ **expenditures** azaldılmış xərclər; ~ **goods** qiyməti aşağı salınmış/ucuzlaşdırılmış mallar; 5. axtalanmış, burulmuş;

◊ ~ **and dried/dry** əvvəldən hazırlanmış, şablon, trafaret *(nəticə, fikir, mülahizə və s. haq.)*

**cut**[3] [kʌt] *v (-tt-, pt, pp* **cut**; *pr p* **cutting)** 1. kəsmək, doğramaq; to ~ *smth.* **in two / in three/in four** *etc.* bir şeyi iki /üç/dörd və s. yerə kəsmək; to ~ *smth.* **in half / into halves** bir şeyi yarı bölmək; to ~ *smth.* **to / in pieces** bir şeyi parça-parça etmək / kəsmək; to ~ **bread** çörək doğramaq; to ~ **meat** ət kəsmək *(süfrə başında)*; to ~ **a slice of cheese** bir dilim pendir kəsmək; to ~ *one's* **nails** dırnaqlarını kəsmək; to ~ **glass with a diamond** şüşəni almazla kəsmək; *This knife won't cut Bu bıçaq kəsmir; Who has cut the table-cloth? Süfrəni kim kəsib? I cut my finger Mən barmağımı kəsdim / kəsmişəm; The icy wind cut me to the bone Soyuq külək mənim iliyimə/sümüyümə işlədi;* 2. kəsilmək, doğranmaq; *The butter was frozen hard and did not cut easily Yağ bərk donmuşdu və çətin kəsilirdi; Cheese cuts easily Pendir asan kəsilir;* 3. qoparmaq, kəsmək; to ~ **flowers** gül kəsmək; *I'll cut away the dead branches Mən qurumuş budaqları kəsəcəm;* 4. vurdurmaq *(saçı)*, qırxmaq *(saçı)*; **to have** *one's* **hair** ~ saçını vurdurmaq / qırxdırmaq; 5. 1) aşağı endirmək; azaltmaq; to ~ **prices** qiymətləri aşağı endirmək, qiymətləri azaltmaq; 2) qısa/kəsə yolla getmək; *We cut across the field Biz çölü kəsə yolla keçdik;* 3) qısaltmaq; to ~ **a manuscript** əlyazmasını qısaltmaq; *The speeches in "Hamlet" are long, so they are often cut in the theatre "Hamlet"də monoloqlar uzundur, çox vaxt onları teatrda qısaldırlar;* 6. biçmək *(həm də* **to ~ out**); to ~ **a coat** palto biçmək; *His coat is well cut Onun paltosu yaxşı biçilib;* 7. vurmaq; *He cut the man across the face O, kişinin üzünə vurdu;* to ~ **a horse with a whip** atı qamçı ilə vurmaq; 8. məyus etmək, xatirinə dəymək; yaralamaq; *What you say cuts me terribly Sənin / Sizin dediyin/dedikləriniz mənim xətrimə dəyir;* **to ~ to the heart** qəlbini yaralamaq; 9. kəsmək, kəsişmək; kəsib keçmək; *The path cuts the meadow diagonally Cığır çəmənliyi düz xətlə kəsir; The lines cut one another Xətlər bir-birini kəsir;* 10. *d.d.* qaçmaq, qaçıb getmək/ aradan çıxmaq *(həm də* **to ~ off / away)**; *I must cut off / away Mən qaçıb aradan çıxmalıyam; Cut away now! Qaçıb aradan çıx!/ çıxın!; Cut! They are after you Qaç! / Qaçın! Onlar sənin / sizin arxanca / arxanızca gəlirlər; The enemy began to run and we cut after him Düşmən qaçmağa başladı və biz onun arxasınca qaçdıq; Cut out and get some sausages! Qaç / Qaçın, bir az kolbasa al/alın;* 11. *d.d.* kəsmək, dayandırmaq; *Cut the noise Səsi kəs/kəsin!* 12. görməmək, fikir verməmək, tanımamaq, məhəl qoymamaq, etinasızlıq göstərmək; *I took off my hat to her but she cut me Mən ona baş əydim, lakin o məni görməməzliyə vurdu;* 13. bölmək, kəsmək *(qumar kağızını)*; 14. *tex.* kəsici alətlə işləyib hazır şəklə salmaq, qabığını almaq, rəndələmək, yonqarlamaq; 15. *rad.* bir proqramdan digərinə keçirmək; 16. biçmək *(taxılı)*; çalmaq *(otu)*; yığmaq *(məhsulu)*; to ~ **hay** ot çalmaq; to ~ **the crop** məhsul yığmaq; to ~ **the corners** künclərı / kənarları biçmək *(taxıl zəmisini biçmək üçün)*; 17. qırmaq *(meşəni)*; to ~ **clear** başdan-başa qırmaq; 18. açmaq, salmaq, çəkmək *(yol, tunel)*; to ~ **a tunnel through a mountain** dağdan tunel çəkmək; to ~ *one's* **way** özünə yol açmaq; *The ships cut their way slowly Gəmilər yavaş-yavaş özlərinə yol açıb irəliyə doğru hərəkət etdi;* to ~ *one's* **way through a crowd** kütlənin/izdihamın içindən özünə yol açmaq; 19. cilalamaq, taraş etmək; yonmaq *(daşı)*; oymaq; to ~ **a figure in stone** daşdan fiqur yonmaq; to ~ **steps in a rock** qayada ayaqyeri oymaq; 20. çıxarmaq *(diş)*; to ~ *one's* **teeth** diş çıxarmaq; *The baby is cutting its teeth Uşaq diş çıxarır;* 21. *id.* kəsmək *(topu)*; 22. kəsib başqa yerə aparmaq *(kompyuterdə)* 23. axtalamaq, burmaq *(heyvanı)*; to ~ **back** 1) qayıtmaq, geri qayıtmaq; 2) hadisələri qarışdırmaq, əvvəlki hadisələri sonrakılardan əvvəl danışmaq; 3) *kino* əvvəl göstərilmiş kadrları təkrar etmək; 4) kəsmək, kəsib gödəltmək *(budaqları, kökləri)*; 5) azaltmaq, kəsmək *(əmək haqqını və s.)*; to ~ **back production/salary** istehsalı / əmək haqqını azaltmaq; to ~ **down** 1) kəsmək *(ağacı)*; 2) qırmaq; *They were ruthlessly cut down Onları amansızcasına qırdılar;* 3) azaltmaq; to ~ **down expenses** xərcləri azaltmaq; 4) qısaltmaq; to ~ **down an article** məqaləni qısaltmaq; to ~ **in** 1) qoşulmaq, qarışmaq *(danışığa və s.)*; 2) telefonda qulaq asmaq *(danışığa və s.)*; 3) *tex.* birləşdirmək; to ~ **off** kəsmək, kəsib atmaq; to ~ **off** *smb.'s* **head** bir kəsin başını kəsib atmaq; to ~ **off** *smb.'s* **limb** bir kəsin əlini və ya ayağını amputasiya etmək; to ~ **off an enemy's retreat** 1) düşmənin geri çəkilməsinin qarşısını kəsmək; 2) ayırmaq, əlaqəni kəsmək *(telefon və s. haq.)*; *The telephone operator cut us before we had finished our conversation Biz danışığımızı qurtarmamışdan əvvəl telefonçu bizim əlaqəmizi kəsdi;* 3) qurtarmaq, dayandırmaq; to ~ **off negotiations** danışıqları yarımçıq kəsmək; 4) əldən al-



maq; yarımçıq qoymaq; *(xüs. vaxtsız ölüm nəticəsində)*; *The war cut off many men in their prime Müharibə çox gənclərin həyatının gözəl çağını əlindən aldı;* to ~ **on** tələsmək; to ~ **out** 1) kəsmək, kəsib götürmək; to ~ **out pictures** şəkilləri kəsmək / kəsib götürmək; 2) biçmək; *She cuts out men's shirts well O, kişi köynəklərini yaxşı biçir;* 3) buraxmaq; to ~ **out unimportant details** vacib olmayan təfərrüatları buraxmaq; 4) pozmaq, atmaq; *The editor cut out the last paragraph Redaktor axırıncı paraqrafı pozdu/atdı;* 5) dayandırmaq, imtina etmək; *The doctor said that I must cut tobacco right out Həkim dedi ki, mən papiros çəkməyi dərhal dayandırmalıyam; I had to cut meat because of my illness Xəstəliyimlə əlaqədar olaraq /Xəstəliyimə görə mən ət yeməkdən imtina etməli oldum; Cut out the nonsense Cəfəngiyyatı kəs/kəsin;*

◊ to ~ **loose** 1) azad etmək, açmaq; to ~ **a boat loose** qayığı açmaq; to ~ **oneself loose from** *one's* **family** ailəsi ilə əlaqəsini kəsmək; 2) özünü sərbəst hiss etmək, sərbəstləşmək; *She cut loose and told me her story O özünü sərbəst hiss etdi və başına gələnləri mənə danışdı;* to ~ **short** gözlənilmədən kəsmək; to ~ **a speech short** gözlənilmədən nitqini / çıxışını kəsmək; to ~ **a long story short** qısası, qısa desək; to ~ **the record** rekordu təzələmək; to ~ **a dash** 1) seçilmək, fərqlənmək *(xarici görkəmcə)*; 2) özünü öymək / tərifləmək, lovğalanmaq; to ~ *one's* **own throat** öz-özünü məhv etmək; to ~ **and come again** iştaha ilə çox yemək *(xüs. ət)*; to ~ **up rough** özündən çıxmaq, hiddətlənmək; çığır-bağır salmaq

**cute** [kju:t] *adj d.d.* 1. ağıllı, zəkalı, kamallı; fərasətli, düşüncəli, fəhmli; tez başa düşən; gözüaçıq; anlaqlı; bic; ~ **idea** ağıllı fikir; *He is as cute as a fox O, tülkü kimi bicdir;* 2. *amer.* cazibədar, cazibəli, məlahətli, sevimli, gözəşirin; gözəl, qəşəng; ~ **hat** qəşəng şlyapa; **a ~ baby** sevimli / gözəşirin uşaq; *What a cute little baby! Nə qəşəng balaca uşaqdır!*

**cutely** ['kju:tlı] *adv* ağılla, fərasətlə, gözüaçıqlıqla, düşüncəli bir tərzdə

**cuteness** ['kju:tnıs] *n* ağıllılıq, fərasətlilik, düşüncəlilik, fəhmlilik; gözüaçıqlıq

**cutler** ['kʌtləʳ] *n* bıçaqçı *(usta)*; bıçaq satan

**cutlery** ['kʌtlərı] *n* 1. *top.i* çəngəl-bıçaq; bıçaq dəsti; 2. bıçaqçılıq, bıçaq qayırma

**cutlet** ['kʌtlıt] *n* əzmə kotlet *(qoyun və ya dana ətindən bişirilmiş)*; **lamb ~s** quzu ətindən kotlet

**cut-off** ['kʌtɔf] *n* 1. kəsilmiş parça, parça; kiçik bir hissə; 2. *amer.* ən kəsə/yaxın yol; **to make a ~** ən yaxın / kəsə yolla getmək

**cut-out** ['kʌtaut] *n* 1. *tex.* qoruyucu *(mexanizmlərdə)*; 2. *tex.* rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*; 3. çevrə, kontur, profil; 4. şəkil, rəsm, model *(kəsib çıxartmaq üçün)*; kəsilmiş fiqur *(kağızdan, ağacdan və s.)*; 5. senzurun kəsib çıxartdığı parça *(pyesdən, filmdən və s.)*; 6. *amer.* sürüdən/naxırdan ayrı düşmüş heyvan

**cutpurse** ['kʌtpə:s] *n* cibgir, cibkəsən

**cutter** ['kʌtəʳ] *n* I 1. həkkak, oyucu *(daş, ağac, sümük və s. üzərində naxış açan usta)*; 2. biçici *(paltar, ayaqqabı biçən usta)*; 3. *k.t.* qoyunqırxan, dəvəqırxan; qırxıcı *(yunqırxan maşında işləyən fəhlə)*; 4. qazmaçı *(mədən fəhləsi)*; 5. kəsər, tiyə, bıçaq, çapacaq; naxış bıçağı, naxış qələmi *(ağacda naxış açmaq üçün)*; kəsən alət /fəhlə; **a pastry** ~ xəmir kəsən *(fəhlə və ya maşın)*; 6. kəsən alət və ya dəzgah

**cutter** ['kʌtəʳ] *n* II 1. *dən.* kater *(motorlu və ya yelkənli kiçik gəmi)*; **steam** ~ buxarla işləyən kater; 2. *amer.* ikiyerli kirşə

**cutthroat**[1] ['kʌtθrout] *n* cani, başkəsən

**cutthroat**[2] ['kʌtθrout] *adj* sərt, amansız, şiddətli, kəskin; ~ **competition** amansız / kəskin rəqabət

**cutting**[1] ['kʌtıŋ] *n* 1. kəsmə, kəsib çıxma; ~ **of the teeth** dişlərin çıxması; 2. kəsmə, kəsib götürmə *(qəzetdən, jurnaldan)*; 3. ucuzlaşdırma, aşağı salınma / salma; ~ **of prices/of wages** qiymətlərin/maaşların aşağı salınması; 4. kəsmə, qırma *(meşə haq.)*; 5. *k.t.* qələm, çilik; şitil *(bitkidən qoparılaraq ayrıca əkilən gövdə və ya kiçik parça)*; ~ **of a vine** tənək qələmi / çiliyi

**cutting**[2] ['kʌtıŋ] *adj* 1. kəsən, kəsici; **the ~ edge of a knife** bıçağın/tiyənin kəsən tərəfi; ~ **tool** kəsici alət; 2. şiddətli, çox güclü, ... işləyən *(külək haq.)*; 3. kəskin, acı, zəhərli, toxunan; ~ **remark** kəskin irad; ~ **irony** acı istehza / rişxənd

**cutting-back** ['kʌtıŋbæk] *n* kəsmə, budama, budanma *(ağac haq.)*

**cutting-in** ['kʌtıŋın] *n* 1. araya girmə *(avtomobillər haq.)*; 2. *id.* yarma *(müdafiəni)*

**cutting tooth** ['kʌtıŋtu:θ] *n* kəsici/ön diş

**cutwater** ['kʌt,wɔ:təʳ] *n dən.* sukəsən *(gəminin burnunun suyu yaran hissəsi)*

**cycle**[1] ['saıkl] *n* 1. dövr, dövrə; tam dövrə; **the ~ of the seasons** ilin fəsillərinin ardıcıl dəyişməsi / dövrü; **lunar ~** *astr.* ayın dövrü; 2. silsilə; **a ~ of songs** mahnıların silsiləsi; 3. uzun vaxt müddəti / dövrü

**cycle**[2] ['saıkl] *v* 1. inkişaf etmə dövrü keçmək; dövri olaraq dəyişmək; 2. dairə boyunca hərəkət etmək; 3. velosiped sürmək, velosipedlə getmək

**cycler** ['saıkləʳ] *n* = **cyclist**

**cycling** ['saıklıŋ] *n* velosiped idmanı

**cyclist** ['saıklıst] *n* velosipedçi, velosiped sürən

**cyclone** ['saıkloun] *n* siklon, qasırğa

**cylinder** ['sılındəʳ] *n* 1. *riyaz.* silindr; 2. *tex.*

silindr *(daxiliyanacaqlı mühərrik);* val *(fırlanan silindr);*
◊ *He has a cylinder missing amer.* ≅ *Onun bir vinti çatmır*
**cylindric** [sɪ'lɪndrɪk] *adj* silindrşəkilli, silindrik
**cylindrical** [sɪ'lɪndrɪkəl] *adj* = **cylindric**
**cylindriform** [sɪ'lɪndrɪfɔ:m] *adj* silindr formalı, silindrəoxşar, silindrvari
**cynical** ['sɪnɪkəl] *adj* abırsız, həyasız, utanmaz, arsız; **a ~ smile** arsız təbəssüm; **a ~ remark** həyasız irad
**cynically** ['sɪnɪkəlɪ] *adv* abırsızcasına, həyasızcasına, utanmazlıqla; arsızlıqla; arsız-arsız; utanmaz-utanmaz
**cypher** ['saɪfə] *n* = **cipher**
**cypress** ['saɪprɪs] *n bot.* sərv, sərv ağacı
**Cyprian**[1] ['sɪprɪən] *n* 1. Kipr/Kıbrıs vətəndaşı, kiprli, kıbrıslı; 2. *d.d.* əxlaqsız/pozğun adam; fahişə
**Cyprian**[2] ['sɪprɪən] *adj* 1. Kipr, Kıbrıs; **north ~** şimali/quzey Kıbrıs/Kipr; 2. əxlaqsız, pozğun *(xüs. qadın haq.)*
**Cypriot(e)**[1] ['sɪprɪout] *n* kiprli, kıbrıslı, Kipr/Kıbrıs vətəndaşı; **Greek ~s** yunan kiprliləri / kıbrıslıları; **Turkish~s** türk kiprliləri / kıbrıslıları
**Cypriot(e)**[2] ['sɪprɪout] *adj* Kipr, Kıbrıs, Kiprə /Kıbrısa aid olan
**Cyrilic** ['sɪrɪlɪk] *adj:* **~ alphabet** Kiril əlifbası
**cyst** [sɪst] *n tib.* kista *(içi maye ilə dolu kisəşəkilli şiş)*
**czar** [za:] *n* çar, padşah, hökmdar
**czardom** ['za:dəm] *n* çarlıq, şahlıq, səltənət, hökmdarlıq
**czarina** ['za:rɪnə] *n* çariça, çar arvadı
**Czech**[1] [tʃek] *n* 1. çex; 2. çex dili
**Czech**[2] [tʃek] *adj* çex; **the ~ language** çex dili; **to speak the ~ language** çex dilində danışmaq



# Dd

**D, d** [di:] *n (pl* **D's, d's** [di:z]) 1. ingilis əlifbasının 4-cü hərfi; *"Davud" begins and ends with (a) "D" "Davud" "D" hərfi ilə başlanır və "D" hərfi ilə qurtarır;* 2. *mus.* S majorun ikinci notu; 3. zəif *(işin aşağı keyfiyyətdə olduğunu göstərən akademik qiymət)*
**dab**[1] [dæb] *n* I 1. yüngül zərbə; dürtmə; **to give smb. a ~** bir kəsə dürtmə vurmaq; **to make/to have a ~ at smb.** bir kəsin üstünə atılmaq /tullanmaq/hücum etmək; 2. yüngülcə toxunma; **to give *one's* face a ~ with a wet sponge** yaş qubka ilə üzünə toxunmaq; 3. ləkə, yaxma *(rəng və s.)*; 4. dimdikləmə; **~ of / with a beak** dimdiklə zərbə vurma; 5. cüzi, az miqdarda; **~ of money** cüzi / az miqdarda pul
**dab** [dæb] *n* II *d.d.* yaxşı bilən / tanıyan, bələd, öz işinin ustası, təcrübəli adam; **a ~ in literature** ədəbiyyatı yaxşı bilən, ədəbiyyata yaxşı bələd olan; *He is a dab at (playing) tennis O, əla tennis oynayır;*
◊ **to be a ~ hand at *smth.*** bir şeyin cikini-bikini bilmək, bikini də, bir şeydə böyük təcrübəsi olmaq, bir şeyi beş barmağı kimi bilmək
**dab**[2] [dæb] *v* **(-bb-)** 1. **(at)** yüngülcə toxunmaq; **to ~ at *smb.* with *one's* finger** bir kəsə barmağı ilə yüngülcə toxunmaq; *She dabbed at the cut with a wet cloth O, yaraya/kəsik yerə yaş dəsmalla yüngülcə toxundu; The girl stopped crying and dabbed her eyes with a handkerchief Qız ağlamağını kəsdi və gözlərini yaylıqla sildi/quruladı;* 2. boyamaq *(rənglə)*; örtmək *(suvaqla)*; zərif lay çəkmək *(fırça ilə)*; **to ~ paint on canvas** kətan üzərinə boya çəkmək; **to ~ *(at)* *one's* lips with a lipstick** dodaqlarına yüngülcə pomada çəkmək
**dabble** ['dæbl] *v* 1. çapalamaq, əlləşmək; sıçratmaq, tökmək *(su)*; **to ~ in the mud** palçığın içində çapalamaq / əlləşmək; 2. yaxalamaq, oynatmaq *(suda və s.)*; **to ~ *one's* hands in the river** əllərini çayda yaxalamaq/oynatmaq; 3. səpmək, çiləmək; **to ~ the wound with *smth.*** yaraya bir şey çiləmək/səpmək; 4. bulanmaq; **to be ~d in blood** qana bulanmaq; 5. **(in, at, with)** ötəri maraqlanmaq / məşğul olmaq; *He dabbles in poetry O, hərdənbir şer yazır; He just dabbles in politics O, siyasətlə elə-belə məşğul olur/maraqlanır*
**dachshund** ['dækshund] *n* taksa *(ayriqıç kiçik it cinsi)*
**dad** [dæd] *n uşaq d.* dədə, ata, atacan; *What are you doing here, dad? Ata, sən burada nə edirsən? Hello, dad! Salam, ata!*
**daddy** ['dædɪ] *n d.d.* ata, atacan *(adətən uşaqlar tərəfindən və ya uşaqlara müraciət edərkən işlədilir)*
**daddyism** ['dædɪzm] *n amer.* ata-babaya / əcdada hörmət
**daddy-long-legs** ['dædɪ'lɔŋlegz] *n zool.* uzunayaq *(həşərat)*
**dado** ['deɪdou] *n (pl* **-os, -oes** [-ouz]) *mem.* 1. kürsülük; 2. panel *(otaq divarının rənginə və inşaat materialına görə fərqlənən aşağı hissəsi)*
**daemon** ['di:mən] *n* = **demon**
**daffodil** ['dæfədɪl] *n* 1. *bot.* nərgizgülü; 2. açıqsarı rəng
**daffy** [da:fɪ] *adj d.d.* axmaq, sarsaq, gic, ağılsız, səfeh, anormal
**daft** [da:ft; *amer.* dæft] *adj* **(-er, -est)** 1. axmaq, gic, sarsaq, səfeh; dəli; *Don't be so daft?; Axmaq olma/olmayın!;* **to drive *smb.* ~** bir kəsi dəli etmək; 2. mənasız, boş; *The idea isn't as daft as it sounds İdeya səsləndiyi qədər də mənasız/boş deyil*
**daftness** ['da:ftnɪs] *n* axmaqlıq, sarsaqlıq, giclik, səfehlik; anormallıq, dəlilik
**dagger** ['dægəʳ] *n* xəncər; **to stab *smb.* with a ~** bir kəsə xəncər soxmaq, bir kəsi xəncərlə öldürmək;
◊ **to look ~s at *smb.*** bir kəsə acıqlı-acıqlı/kinli-kinli baxmaq; *He looked daggers at me when I told him he was lazy Mən ona tənbəlsən dedikdə/deyəndə, o mənə acıqlı-acıqlı/kinli-kinli baxdı;* **at ~s drawn *(with smb.)*** bir kəslə qanlıbıçaq / siyirtməxəncər; *He and his partner are at daggers drawn O və onun partnyoru qanlıbıçaqdırlar/siyirtməxəncərdirlər*
**dahlia** ['deɪljə] *n* 1. *bot.* georgin *(çiçək)*
**daily**[1] ['deɪlɪ] *n* gündəlik/gündə çıxan qəzet
**daily**[2] ['deɪlɪ] *adj* 1. gündəlik, hər gün; hərgünkü; adi; **~ duty** gündəlik növbətçilik; **~ paper** gündəlik/gündə çıxan qəzet; **~ cares** gündəlik/adi qayğılar; **~ wants** gündəlik tələbatlar / ehtiyaclar; **~ training programme** *id.* gündəlik məşq qrafiki;
◊ **~ bread** gündəlik ruzi/çörək; **to gain *one's* ~ bread** gündəlik ruzi/çörək qazanmaq
**daily**[3] ['deɪlɪ] *adv* 1. hər gün; *The train runs daily Qatar hər gün gedir;* 2. həmişə, daima, daim; **to happen ~** həmişə baş vermək; *The machines are inspected twice daily Maşınlar hər gün iki dəfə yoxlanılır*
**dainty** ['deɪntɪ] *adj* **(-ier, -iest)** 1. zərif, incə, gözəl, qəşəng; **~ flower** zərif / incə / gözəl çiçək; **~ lace** zərif krujeva / tor; **a ~ child** gözəl/qəşəng uşaq; **~ feet** zərif ayaqlar; 2. dadlı, ləzzətli, zə-

rif; ~ **bits** dadlı/ləzzətli tikələr; ~ **dishes** dadlı/ləzzətli yeməklər; 3. tələbkar; vasvası; ~ **appetite** yeməkdə tələbkar/vasvası; ~ **eater** yeməkdə vasvası adam;

◊ **to have a ~ tooth** yeməkdə vasvası/ tələbkar olmaq

**daintily** [ˈdeıntılı] *adv* zövqlə, qəşəng, gözəl, incə; **dressed** ~ gözəl /qəşəng /zövqlə geyinmiş; *The young girl was dressed daintily Gənc qız zövqlə geyinmişdi*

**daintiness** [ˈdeıntınıs] *n* **1.** qəşənglik, incəlik; **2.** tələbkarlıq, vasvasılıq *(yeməkdə və s.)*

**dairy**[1] [ˈdeərı] *n* **1.** yağ zavodu; pendir istehsalatı, pendir istehsal edən müəssisə; **2.** süd zavodu; **3.** südçülük təsərrüfatı; **4.** *top.i.* südverən / sağılan heyvan *(həm də ~* **cattle**); **5.** süd məhsulları satan mağaza

**dairy**[2] [ˈdeərı] *adj* süd; ~ **products** süd məhsulları; ~ **equipment** südçülük təsərrüfatı avadanlığı / ləvazimatı; ~ **farmer** sağmal heyvan yetişdirən fermer; ~ **cattle** sağmal / sağılan mal-qara

**dairy**[3] [ˈdeərı] *v* sağmal mal-qara yetişdirmək

**dairy-farm** [ˈdeərıfa:m] *n* südçülük ferması / təsərrüfatı

**dairy-farmer** [ˈdeərı.fa:məʳ] *n* **1.** südçülük təsərrüfatının sahibi; **2.** sağmal heyvan yetişdirən fermer

**dairy husbandary** [ˈdeərıˈhʌzbəndrı] *n* südçülük təsərrüfatı

**dairying** [ˈdeərıŋ] *n* süd məhsullarının istehsalı; süd məhsullarının satışı

**dairymaid** [ˈdeərımeıd] *n* sağıcı; süd fermasının işçisi

**dairyman** [ˈdeərımən] *n (pl* **-men** [-mən]) **1.** südçülük fermasının sahibi; **2.** sağıcı *(kişi)*, südçülük fermasında işləyən *(kişi)*; **3.** südçü, südsatan; süd məhsulları alverçisi

**dairy-woman** [ˈdeərı.wumən] *n (pl* **-women** [-.wımın]) südçülük fermasının sahibəsi

**dais** [deıs] *n* kafedra *(auditoriyalarda mühazirəçi və ya məruzəçi üçün hündür yer)*

**daisy** [ˈdeızı] *n bot.* qızçiçəyi *(xırda çiçəkli bağ bitkisi)*

**dale** [deıl] *n* I *şair* dərə, vadi; *(xüs. şimali İngiltərədə: The Yorkshire Dales Yokşir Dərələri)*; **hill and** ~ dərə və təpə; ~ **and down** dağ və dərə;

◊ **up hill and down** ~ ≅ baş götürüb getmə

**dale** [deıl] *n* II torpaq sahəsi, tarla, zəmi, əkin yeri

**dalliance** [ˈdælıəns] *n* **1.** əyləncə; boş-boş vaxt keçirmə; **to live in idle** ~ vaxtını boş-boş keçirmək, heç nə ilə məşğul olmamaq; **2.** qeyri-ciddi münasibət; dəcəllik, şuluqluq, zarafat; **3.** eşqbazlıq, mazaqlaşma; işvə, naz; **gentle** ~ şit işvə/naz

**dally** [ˈdælı] *v (pt, pp* **dallied**) *d.d.* **1.** boş yerə vaxt itirmək, *(həm də ~* **away**); boş-bekar gəzmək, heç bir iş görməmək, veyllənmək, avara gəzmək; **to ~ over** ***one's*** **work** canlərdi/gücbəla ilə işləmək; *Don't dally here! Burada veyllənmə!* **2.** boş / mənasız işlə məşğul olmaq; qeyri-ciddi yanaşmaq *(bir kəsə / şeyə)*; **to ~ with the business** işə qeyri-ciddi yanaşmaq; **3.** naz etmək, əzilib-büzülmək; qır vermək; özünü bəyəndirməyə çalışmaq; məzələnmək, mazaqlaşmaq; **to ~ with a woman's affections** bir qadının hissləri ilə oynamaq; **4.** *arx.* təxirə salmaq, yubatmaq; **to ~ away** boş yerə/boş-boşuna vaxt itirmək; **to ~ away** ***one's*** **time** vaxtını boş-boşuna itirmək; imkanı əldən vermək

**daltonian** [dɔ:lˈtounıən] *n tib.* = **daltonist**

**daltonism** [ˈdɔ:ltənızm] *n* daltonizm *(gözün bəzi rəngləri seçə bilməməsi)*

**daltonist** [ˈdɔ:ltənıst] *n* daltonik *(gözü bəzi rəngləri seçə bilməyən adam)*

**dam**[1] [dæm] *n* I **1.** damba, torpaq bənd, bənd, dalğaqıran; **2.** dəhnə, qabağı bağlanmış / kəsilmiş su

**dam** [dæm] *n* II balalıq *(heyvanlarda)*

**dam**[2] [dæm] *v (həm də ~* **up**) **1.** bənd tikmək, bəndlə qabağını kəsmək/bağlamaq *(suyun)*, qabağını kəsmək/bağlamaq *(çayın)*; **2.** qabağını kəsmək, əngəl yaratmaq /törətmək, mane olmaq; **to ~ a passage** keçidi kəsmək; **to ~ up** ***one's*** **feelings** hisslərini cilovlamaq, hisslərinin qarşısını almaq; **to ~ out** suyu ötürmək *(dəhnə vasitəsilə)*

**damage**[1] [ˈdæmıdʒ] *n* **1.** zərər, ziyan, xarab etmə, korlama, zədə; itki, tələfat; **brain** ~ beyin zədəsi; *The vandals did a lot of damage to the car Vəhşilər maşına böyük / çox ziyan vurdular*; **to the ~ of** ***smth.*** bir şeyin ziyanına/zərərinə; *This could cause serious damage to the country's economy Bu bulud ölkənin iqtisadiyyatına ciddi ziyan verə bilərdi; Please let me pay for the damage Zəhmət olmasa, qoy / qoyun mən ziyanı ödəyim;* **to do/to cause ~ (to) 1)** ziyan/zərər/tələfat vermək, xarab etmək, zədələmək; *The fire caused great damage to the house Yanğın evə çox böyük ziyan/zərər vurdu;* **2)** narahatlıq yaratmaq /törətmək; **2.** *hüq.* zərəri / ziyanı / zədəni/tələfatı ödəmək üçün tələb olunan pul; **to claim ~s** zərərin/ziyanın ödənilməsini tələb etmək; **to repair / to pay the ~s** zərəri/ziyanı ödəmək; **3.** zərər/ziyan üçün kompensasiya, zərəri/ziyanı ödəmə; **action for / of ~s** ziyanı ödəmək haqqında iddia; **to recover ~s** ziyanın/zərərin/itkinin əvəzini almaq, itkiyə/ziyana görə kompensasiya almaq; **to be awarded ~s** itkini/ziyanı ödəmək hüququ almaq; **4.** *(əsas. cəm formada) arx.* dəyər; xərc; *I'll stand the damage Xərci mən ödəyəcəm*

**damage**[2] [ˈdæmıdʒ] *v* **1.** zədələmək, zərər/ziyan vurmaq; korlamaq, xarab etmək; **to ~ a house/a ship/a car** evi/gəmini/maşını xarab etmək; *The house was badly damaged by fire Ev yanğından çox zərər çəkdi;* **2.** xarab olmaq, korlanmaq; *Relations between the two countries have been badly / severely damaged by this incident Bu insidentə/hadisəyə görə iki ölkə arasında əlaqələr çox korlanıb*



**damageable** [ˈdæmıdʒəbl] *adj* tezxarab olan, tezzədələnən, tezəzilən, tezzədəalan

**damaging** [ˈdæmıdʒıŋ] *adj* korlayan, xarab edən, ziyan/zərər vuran; ~ **chemicals** ziyan / zərər verən kimyəvi maddələr

**damask** [ˈdæməsk] *n* kamka *(naxışlı, güllü ipək parça; naxışla bəzədilmiş parça/material)*

**dame** [deım] *n jarq.* **1.** xanım; **2.** ahıl / yaşlı qadın; **3.** xüsusi titul verilmiş qadın

**damn**[1] [dæm] *n* lənət, qarğış, nifrin; söyüş; **to give** ***smb.*** **~s and curses** bir kəsə qarğış və lənət yağdırmaq;

◊ **not worth a ~** bir qara qəpiyə dəyməz

**damn**[2] [dæm] *v* **1.** lənət oxumaq, nifrin etmək, qarğamaq, lənətləmək; *Be damned to you! Cəhənnəm ol/olun! Rədd ol/ olun! I'll be damned if I'll go there Əgər mən ora getsəm, lənətə gəlim! Damn you all! Hamınız lənətə gələsiniz!* **2.** pisləmək, bəyənməmək, qınamaq; töhmət / məzəmmət etmək; **to ~ a play / a book** ***etc.*** pyesi/kitabı tənqid etmək / pisləmək / bəyənməmək; *The play was bad; the newspapers all damned it Pyes pis idi; qəzetlərin hamısı onu pislədi;* **3.** məhv/tələf/həlak etmək; korlamaq; **to ~** ***smb.'s*** **prospects** bir kəsin karyerasını korlamaq

**damn**[3] [dæm] *interj. Acıq, hirs, narazılıq və s. ifadə edir; Lənətə gəlsin/gəlmiş; Damn (it)! I've lost my knife Lənətə gəlsin. Bıçağımı itirmişəm*

**damnable** [ˈdæmnəbl] *adj* **1.** iyrənc, yaramaz; çox pis, dəhşətli, müdhiş; ~ **lies** müdhiş / iyrənc yalanlar; ~ **weather** çox pis /dəhşətli hava; *The dinner was damnable Nahar çox pis idi / ağıza alınası deyildi;* **2.** lənətə / qarğışa layiq

**damnably** [ˈdæmnəblı] *adv* olduqca, çox, həddən artıq, son dərəcə; **to be ~ sorry** çox təəssüf etmək; *I'm damnably sorry Mən çox təəssüf edirəm*; ~ **expensive** çox / həddən artıq baha

**damnation** [dæmˈneıʃn] *n* **1.** lənət, nifrin; *May damnation take him Qoy o, lənətə gəlsin*; **2.** ittihamnamə, ciddi töhmət/tənqid

**damnatory** [ˈdæmnətərı] *adj* **1.** pisləyən, ittiham edən, qınayıcı; ~ **view of** ***smth.*** bir şey haqqında mənfi / pis fikir; bir şeyi pisləmə /qınama; **2.** öldürücü, məhvedici; zərərli, zərərverən, fəlakətli; ~ **weakness** məhvedici zəiflik

**damned** [ˈdæmd] *adj* çox pis, çirkin, iyrənc, mənfur; qorxulu, qorxunc, son dərəcə, çox şiddətli; *It is a damned lie Bu iyrənc yalandır; She is a damned fool O tamam sarsaq qadındır; It's damned hot today Bu gün son dərəcə/çox bərk istidir*

**damp**[1] [dæmp] *n* **1.** nəmlik, nəmişlik, rütubət, rütubətlilik, yaşlıq; **evening ~** axşam nəmliyi/nəmişliyi; **a smell of ~ in the old house** köhnə evdə nəmişlik iyi; *The damp in the air makes my bones hurt Havadakı nəmişlik mənim sümüklərimi ağrıdır;* **2.** ümidsizlik, məyusluq, ruhdan düşmə; ümidsiz vəziyyət; **to cast a ~ over a holiday** bayramı korlamaq; **to strike a ~ into** ***smb.'s*** **heart** bir kəsi ümidsizliyə düçar etmək/salmaq, bir kəsi ruhdan salmaq; **to cast a ~ upon trade** ticarətdə durğunluq yaratmaq; **3.** *d.d.* içki məclisi; **to give oneself a ~** bir qədəh/ stəkan ötürmək *(içmək);* **4.** mədən qazı

**damp**[2] [dæmp] *adj* **1.** nəm, rütubətli, yaş; tərləmiş, tərli, tər basmış; ~ **bed/sheet** nəm yatacaq/mələfə; ~ **linen** nəm tuman-köynək, dəyişək, alt paltarı; ~ **summer** rütubətli yay; ~ **weather** nəm / rütubətli / yağmurlu hava; **2.** *arx.* məyus, qəmgin, kədərli, hüznlü, dilxor, mütəəssir, sarsılmış; **3.** *arx.* dumanlı, sisli

**damp**[3] [dæmp] *v* **1.** nəm etmək, islatmaq, nəmləndirmək, yaş eləmək/etmək; *The dew damped the path Şeh cığırı nəmləşdirmişdi/nəm etmişdi;* **2.** zəiflətmək; qarşısını almaq; söndürmək; **to ~ *(down)* a fire** ocağı/alovu söndürmək; **to ~** ***one's*** **appetite** iştəhasını korlamaq; **to ~ trade** ticarəti zəiflətmək; **to ~ down the agitation** həyəcanı sakitləşdirmək; **3.** çaşdırmaq, sarsıtmaq, inamını qırmaq, sarsıtmaq, ruhdan salmaq; sıxıntı vermək, əzmək; **to ~** ***smb./smb.'s*** **spirits** bir kəsi sarsıtmaq/ruhdan salmaq; **to ~** ***smb.'s*** **ardour** bir kəsin ehtirasını söndürmək; **to ~** ***smb.'s*** **hopes** bir kəsin ümidlərini boşa çıxartmaq;

◊ **to ~ oneself** ≅ boğazını yaşlamaq

**dampen** [ˈdæmpən] *n* **1.** islatmaq, yaş etmək; *The rain dampened the ground Yağış torpağı islatdı*; **2.** nəm/rütubət çəkmək; **3.** əks-sədanı azaltmaq *(radiostudiyada)*

**dampish** [ˈdæmpıʃ] *adj* nəmtəhər, höyüş, bir qədər nəm / rütubətli

**dampness** [ˈdæmpnıs] *n* nəmişlik, rütubət, yaşlıq, rütubətlilik; nəm/rütubət çəkmiş yer

**damp-proof** [ˈdæmppru:f] *adj* nəm/rütubət keçirməyən, nəmə /rütubətə davamlı

**dampy** [ˈdæmpı] *adj* nəmtəhər, höyüş; bir qədər nəm / rütubətli

**damsel** [ˈdæmzəl] *n arx.* qız, ərsiz gənc qadın; *How could I ignore a damsel in distress Qəmqüssəyə düçar olmuş bir qıza mən necə laqeyd qala bilərdim*

**damson** [ˈdæmzən] *n* **1.** *bot.* cır gavalı; **2.** qırmızı-göy rəng, cır gavalı rəngi

**dance**[1] [da:ns] *n* **1.** rəqs, oyun; **to go to a ~** rəqsə getmək; **to study a ~** rəqs öyrənmək; **a gipsy ~** qaraçı rəqsi / oyunu; *The waltz is a beautiful dance Vals gözəl rəqsdir*; **2.** oyun havası; **to compose ~s** oyun havası bəstələmək; **to give a ~** oyun /rəqs gecəsi təşkil etmək; **3.**

rəqs etmə, oynama; bal/rəqs gecəsi; *May I have the next dance with you? İcazə ver / verin səni / sizi növbəti rəqsə dəvət edim; We are going to a dance tonight Bu axşam biz rəqsə gedəcəyik / gedirik*

**dance²** [da:ns] *adj* rəqs, oyun; ~ **hall** rəqs zalı; ~ **floor** rəqs meydançası

**dance³** [da:ns] *v* **1.** rəqs etmək, oynamaq; **to ~ to fast music** cəld musiqiyə oynamaq; *She loves to dance to fast music O, cəld musiqiyə oynamağı sevir;* **2.** oynamaq; *The waves danced in the sunlight Dalğalar günəş şüaları altında oynayırdı;* **3.** atılıb-düşmək *(həm də* **to ~ about /up/ down***);* **to ~ for joy** sevincdən atılıb-düşmək; **to ~ (up and down) with rage/with pain** qəzəbdən/ağrıdan atılıb-düşmək; **4.** yellənmək, yırğalanmaq; fırlanmaq; **to ~ on the waves** dalğalar üzərində yırğalanmaq/yellənmək *(qayıq və s. haq.);* **to ~ in the wind** küləkdə fırlanmaq *(yarpaq, qar dənəciyi haq.);* **5.** oynatmaq, yırğalamaq; atıb-tutmaq; **to ~ a child on** ***one's*** **knee** uşağı dizi üstündə oynatmaq/atıb-tutmaq / yırğalamaq;

◊ **to ~ to/after** ***smb.'s*** **pipe/piping, to ~ to** ***smb.'s*** **tune** bir kəsin çaldığına oynamaq; **to ~ on a volcano** ≅ odla oynamaq

**dancer** [ˈda:nsəʳ] *n* rəqqas, rəqqasə; oynayan; *He's a good dancer O, yaxşı rəqqasdır;* **ballet ~** balerina; *She's a dancer O, rəqqasədir*

**dancing¹** [da:nsıŋ] *n* rəqs, oynama, rəqs etmə; atılıb düşmə

**dancing²** [da:nsıŋ] *adj* rəqs; ~ **lesson** rəqs dərsi; ~ **shoes** rəqs ayaqqabısı

**dancing-girl** [ˈda:nsıŋgə:l] *n* rəqqasə

**dancing-malady** [ˈda:nsıŋ.mælədı] *n tib.* xoreya *(əl-ayağın qeyri-ixtiyari titrəməsindən ibarət əsəb xəstəliyi)*

**dancing-master** [ˈda:nsıŋ.ma:stəʳ] *n* rəqs müəllimi

**dancing-mistress** [ˈda:nsıŋ.mıstrıs] *n* rəqs müəlliməsi, rəqs müəllimi *(qadın)*

**dancing-party** [ˈda:nsıŋ.pa:tı] *n* rəqs gecəsi

**dancing-plague** [ˈda:nsıŋpleıg] *n* = **dancing-malady**

**dancing-school** [ˈda:nsıŋsku:l] *n* rəqs məktəbi

**dandelion** [ˈdændılaıən] *n bot.* zəncirotu

**dandle** [ˈdændl] *v* **1.** yellətmək, yırğalamaq; **to ~ a child in** ***one's*** **arms /on** ***one's*** **lap** uşağı qolları üstündə/dizi üstə yırğalamaq; **2.** oxşamaq, əzizləmək, nazlamaq; nəvaziş göstərmək, ərköyün böyütmək; **3.** (**with**) oynamaq, əylənmək, dilxoşluq etmək

**dandruff** [ˈdændrəf] *n* kəpək *(başda)*

**dandy¹** [ˈdændı] *n* dəndi, modabaz *(həmişə son modalı paltar geyən adam)*, şıq geyinən *(adam)*

**dandy²** [ˈdændı] *adj* çox şıq, yaraşıqlı, bahalı, çox bəzəkli, çox yaxşı, əla; **a ~ idea** əla / çox yaxşı ideya; *That's a dandy idea Bu əla / çox yaxşı fikirdir*



**Dane¹** [deın] *n* danimakalı *(xalq);* **the ~** *top.i* danimarkalılar

**Dane²** [deın] *adj* danimarkalı

**danger** [ˈdeındʒəʳ] *n* təhlükə, qorxu, hədə, təhdid; xətər; **to expose** ***smb.*** **to ~** bir kəsi təhlükəyə salmaq / məruz qoymaq; **to face the ~** təhlükənin üzünə / gözünə düz baxmaq; *His life is in danger Onun həyatı təhlükədədir;* **to be out of ~** təhlükəsiz olmaq; ~ **of death** ölümcül təhlükə, ölüm təhlükəsi; *He goes in danger of his life Onu ölüm təhlükəsi hədələyir; At danger! Təhlükəlidir! (təhlükə haq. xəbərdarlıq işarəsi);* **~ to a country /to peace** vətən /sülh üçün təhlükə; *There is a lot of danger involved in rock climbing Alpinizmlə məşğul olmaqda çoxlu təhlükə var; Is there any danger of fire? Bir yanğın təhlükəsi varmı? That man is a danger to society O adam cəmiyyət üçün təhlükədir*

**dangerous** [ˈdeındʒrəs] *adj* **1.** təhlükəli; təhdidedici, hədələyici; qorxulu; **a ~ illness/journey /bridge** təhlükəli xəstəlik/səyahət /körpü; ~ **driving** təhlükəli / qorxulu sürmə *(maşını);* **a ~ man / beast** təhlükəli /qorxulu adam/vəhşi heyvan; **~ to health** sağlamlıq üçün təhlükəli /qorxulu; **2.** *d.d.* təhlükəli / qorxulu vəziyyətdə olan; *He is in dangerous O təhlükədədir*

**dangerously** [ˈdeındʒrəslı] *adv* təhlükəli, qorxulu, təhlükəli/qorxulu tərzdə; **to drive a car ~** maşını təhlükəli tərzdə sürmək; **to be ~ ill** ağır /bərk xəstə olmaq; *He is dangerously ill O, bərk/ağır xəstədir*

**danger-signal** [ˈdeındʒə.sıgnl] *n* təhlükə siqnalı

**dangle** [ˈdæŋgl] *v* **1.** yellənmək, sallanmaq; yellətmək, oynatmaq, əsdirmək; **to ~** ***one's*** **feet** ayaqlarını yellətmək; **to ~** ***smth.*** **before** ***smb.'s*** **eyes** bir şeyi bir kəsin gözləri qarşısında yellətmək; *He dangled the keys on his chain O, zəncirdəki açarları yellətdi; He dangled his watch in front of the baby O, saatını uşağın qarşısında yellətdi;* **2.** boş-boş/avara-avara gəzmək, veyllənmək (*həm də* **to ~ about /around**); **3.** (**after**) qaçmaq *(bir kəsin arxasınca)*, ...ətrafında fırlanmaq/dolanmaq, başına dolanmaq; sürünmək; **4.** başdan/yoldan çıxarmaq, tovlamaq, şirnikdirmək; **to ~ bright prospects before** ***smb.*** bir kəsə parlaq gələcək vəd etmək; **to ~ hopes in** ***smb.'s*** **sight** bir kəsi ümidlərlə yoldan/başdan çıxartmaq / azdırmaq

**dangler** [ˈdæŋgləʳ] *n* **1.** sərbəst tərzdə sallanan şey; **2.** veyl, avara, tənbəl *(adam);* **3.** qadın düşkünü, arvadbaz

**Danish** [ˈdeınıʃ] *n* Danimarka dili

**Danish** [ˈdeınıʃ] *adj* Danimarka

**dank** [dæŋk] *adj* nəm, rütubətli; ~ **weather** nəm /rütubətli hava; ~ **cellar** nəm/rütubətli zirzəmi /anbar; **a ~ cave** nəm/rütubətli mağara

**dankish** [ˈdæŋkıʃ] *adj* nəmtəhər, bir az nəm / rütubətli



**dapper** [ˈdæpəʳ] *adj* **1.** şıq geyinmiş/geyinən *(xüs. alçaq boylu, cəld hərəkət edən adam haq.);* gözəl, qəşəng; ~ **flower** gözəl/qəşəng çiçək; **2.** cəld, yeyin, tez, zirək, çevik, diribaş *(adət. alçaqboylu adamlar barədə)*

**dapple** [ˈdæpl] *n* **1.** qeyri-bərabər rənglənmə/boyanma; **2.** boz xallı at; **3.** xal-xal heyvan

**dappled** [ˈdæpld] *adj* xal-xal, xallı, ala *(at rəngi);* **a ~ horse** xallı boz at; **a ~ deer** xallı maral; ~ **shade** ala kölgə

**dare¹** [deəʳ] *n d.d.* meydan oxuma; çağırış; **to give a ~** meydan oxumaq; **to take a ~** çağırışı qəbul etmək; riskə getmək; *He only entered the competition for a dare O, yarışa ancaq çağırışa görə / cavab olaraq qoşuldu*

**dare²** [deəʳ] *v (pt, pp* **dared** [deəd] *arx.* **durst** [də:st]; **dared**; *indiki zamanda qısa inkar forması:* **daren't***)* **1.** cürət / cəsarət etmək, cürətlənmək, ürəklənmək; həyasız /abırsız olmaq; *I dare not / daren't go there Mən ora getməyə cəsarət etmirəm; How dare you say such a thing? Sən / Siz belə şey deməyə necə cəsarət edirsən / edirsiniz?; He doesn't dare (to) answer O, cavab verməyə cəsarət etmir; He won't dare to deny it Onun bunu inkar etməyə cəsarəti çatmaz;* **2.** təhlükəyə məhəl qoymamaq, təhlükəni saymamaq, təhlükədən qorxmamaq, risk etmək, riskə getmək; *He dared the danger of the girl's family O, qızın ailəsinin qəzəbinə məhəl qoymadı;* **to ~** ***smb.*** **to do** ***smth.*** bir kəsi bir iş görməyə cəsarətləndirmək/sövq etmək; bir iş görməyə çağırmaq; **to ~** ***smb.*** **to a fight** bir kəsi dava etməyə cəsarətləndirmək/çağırmaq; *I dared him to jump Mən hoppanmaq üçün ona ürək-dirək verdim;*

◊ **to ~ all things** hər bir iş görməyə hazır olmaq; *I dare say Məncə, Mənə görə, Mənə elə gəlir ki,...; I dare say he will come by the night train Məncə / Mənə belə gəlir ki, o, gecə qatarı ilə gələcək*

**daredevil** [ˈdeə.devl] *n* qoçaq, igid, cəsur, dəliqanlı, qoçu, dəlibaş

**daredevilry** [ˈdeə.devlrı] *n* dəliqanlılıq, cəsurluq, qoçuluq, qoçaqlıq

**daring¹** [ˈdeərıŋ] *n* cürət, cəsarət; igidlik, qoçaqlıq, ürəklilik, hünər

**daring²** [ˈdeərıŋ] *adj* **1.** cürətli, cəsarətli, ürəkli, qoçaq, igid, cəsur, şücaətli; **a ~ explorer** cəsur / cürətli tədqiqatçı; **a ~ person** cəsarətli / cürətli / ürəkli / igid / cəsur adam; ~ **plan** cəsarətli plan; **2.** dava-dalaşlı; **a ~ film** dava-dalaşlı film

**dark¹** [da:k] *n* **1.** qaranlıq, zülmət; gecə; *All the lights went out and we were left in the dark Bütün işıqlar söndü və biz qaranlıqda qaldıq; Are you afraid of the dark? Sən/Siz qaranlıqdan qorxursanmı/qorxursunuzmu?; Some children are afraid of the dark Bəzi uşaqlar qaranlıqdan qorxur;* **after ~** qaranlıq düşəndən sonra; **before ~** qaranlıq düşməzdən əvvəl; *He returned home before dark O, evə qaranlıq düşməzdən əvvəl qayıtdı; Father came home after dark Ata evə qaranlıq düşəndən sonra gəldi;* **day and ~** gündüz və gecə; **to sit in the ~** qaranlıqda oturmaq; **2.** məlumatsızlıq, xəbəri olmama, cəhalət; **to keep someone in the ~** bir kəsi cəhalətdə saxlamaq; **business done in the ~** xəlvətdə/gizli görülən iş; *They kept the public in the dark about their agreement Onlar sazişləri haqda ictimaiyyətə xəbər vermədilər;* **3.** sirr, gizlilik, məxfilik; **to plot in the ~** gizlində sui-qəsd hazırlamaq; *His plans were made in the dark Onun planları xəlvətdə/gizlində hazırlanmışdı*

**dark²** [da:k] *adj* (**-er, -est**) **1.** qaranlıq; **a ~ room/street** qaranlıq otaq /küçə; ~ **night** qaranlıq gecə; **2.** tutqun; ~ **day** tutqun gün; **3.** qara; ~ **dress** qara paltar; ~ **hair** qara saç; *She has dark hair Onun qara saçı var;* ~ **days** *məc.* qara günlər; ~ **times** ağır vaxtlar; **4.** tünd; ~ **red /green/yellow** tünd-qırmızı/yaşıl/sarı; **5.** qarayanız, qarabuğdayı; **a ~ complexion** qarayanız çöhrə; **6.** gizli, sirli; əsrarəngiz; **a ~ secret** gizli sirr; **7.** müəmmalı, dumanlı; dolaşıq; ~ **hint** müəmmalı/dumanlı eyham; ~ **problem** dolaşıq problem; *The meaning is still dark Məna hələ də aydın deyil/dolaşıqdır*

**darken** [ˈda:kn] *v* **1.** qaranlıqlaşmaq, qaralmaq *(həm də məc.); The sky quickly darkened after sunset Günəş batdıqdan sonra tezliklə səma qaranlıqlaşdı/qaraldı; His face darkened with anger when he heard the bad news O, pis xəbəri eşidərkən sifəti/üzü qəzəbdən qaraldı; This terrible event will darken the rest of our lives Bu dəhşətli hadisə bizim həyatımızın qalan hissəsini qaraldacaq;* **2.** tündləşdirmək; *Darken the green paint by adding black paint Qara rəng qatmaqla yaşıl rəngi tündləşdir / tündləşdirin;* **to ~** ***smb.'s*** **light** bir kəsin işığını kəsmək;

◊ *Don't darken my door again! Bir də ayağın/ayağınız mənim qapıma dəyməsin!*

**darkish** [ˈda:kıʃ] *adj* bir qədər tünd, tutqun, qarayaçalar

**darkness** [ˈda:knıs] *n* **1.** qaranlıq; zülmət; gecə; **2.** qara rəng; qaralıq, qarabuğdayılıq; **3.** tutqunluq, qəmginlik; **4.** korluq; **5.** cəhalət, avamlıq, mədəniyyətsizlik; **6.** sirr, gizlilik, məxfilik; **7.** qeyri-müəyyənlik, anlaşılmazlıq, qarışıqlıq, hərc-mərclik

**darkroom** [ˈda:kru:m] *n* qaranlıq otaq *(fotoşəkil çıxarmaq üçün istifadə edilən)*

**darling¹** [ˈda:lıŋ] *n* **1.** əziz, doğma, sevimli *(müraciət məqamında işlədilir); My darling Əzizim;* **2.** istəkli, sevimli; nadinc, dəcəl; **the ~ of the people** hamının sevimlisi / istəklisi; **the ~ of fortune** bəxtəvər, xoşbəxt; **3.** çox yaxşı adam

**darling²** [ˈda:lıŋ] *adj* **1.** əziz, istəkli, çox sevilən; ***one's*** **~ child** əziz/istəkli uşaq; *My darling*

*daughter Mənim əziz/sevimli/istəkli qızım; Did you have a good day, darling? Əzizim, bu günün yaxşı keçdimi?* 2. ən əziz/istəkli/müqəddəs; *My darling hope was to see her Mənim müqəddəs arzum onu görmək idi;* 3. qəşəng, çox gözəl; zərif, incə, füsunkar, cazibəli; **a ~ room** qəşəng/çox gözəl otaq; *What a darling little baby! Nə qəşəng uşaqdır! What a darling little room! Nə qəşəng balaca otaqdır!*

**darn¹** [da:n] *n* I gözəmə, yamama, gözənmiş / yamanmış yer

**darn** [da:n] *n* II *d.d.* lənət, nifrin; qarğış; ◊ **not to care/ to give a ~** qətiyyən diqqət yetirməmək, tamam laqeyd olmaq

**darn²** [da:n] *v* I gözəmək, çitəmək; **to patch and ~** yamamaq və gözəmək

**darn** [da:n] *v* II lənətləmək, lənət oxumaq, nifrin yağdırmaq; söymək, söyüş etmək / yağdırmaq

**darner** ['da:nəʳ] *n* 1. gözəməçi, gözəyən, yamaqçı; 2. gözəmək/çitəmək üçün iynə

**darning** ['da:nıŋ] *n* 1. gözəmə, çitəmə; *I hate darning Mənim gözəmədən/çitəmədən xoşum gəlmir;* 2. gözənməli/çitənməli şey

**darning-ball** ['da:nıŋbɔ:l] *n* gözəmək/çitəmək üçün istifadə edilən ağac yumurta

**darning-needle** ['da:nıŋ.ni:dl] *n* gözəmək / çitəmək üçün iynə

**dart¹** [da:t] *n* 1. mizraq, cida; 2. neştər, iynə *(arıda, əqrəbdə və s.);* 3. kökatma, kökləmə, kök *(paltar tikərkən müvəqqəti olaraq tikmə);* tikiş yeri, tikiş; kökatma *(tikiş);* 4. sıçrayış, sıçrama; **to make a ~ for the door** qapıya tərəf/doğru sıçramaq; **ready for the ~** atılmağa/sıçramağa hazır

**dart²** [da:t] *v* 1. atmaq; **to ~ an arrow** ox atmaq; 2. *məc.* salmaq; **to ~ an angry look at smb.** bir kəsə acıqlı nəzər salmaq; *She darted an angry look at me O mənə acıqlı bir nəzər saldı;* 3. atılmaq, tullanmaq; **to ~ forward** irəli atılmaq/tullanmaq; *She made a dart for the exit O, çıxışa (tərəf) atıldı;* 4. şığımaq *(təyyarə, quş və s. haq.); Swallows are darting through the air Qaranquşlar havada şığıyırlar;* 5. cəld çıxartmaq; *The snake darted out its tongue İlan dilini cəld çıxartdı*

**dartboard** ['da:tbɔ:d] *n* "oxatma" oyunu üçün lövhə *(hədəf)*

**dartingly** ['da:tıŋlı] *adv* ildırım sürəti ilə; çox iti / cəld, ildırım kimi

**darts** [da:ts] *n* "oxatma" oyunu *(əsasən ingilis klublarında oynanılan oyun; üzərində rəqəmlər olan lövhəciyə ucunda lələk olan oxabənzər əşya atılır, onun hansı rəqəmə sancılması ilə xal yığılır; qalib sayca çox xal yığan oyunçu hesab olunur)*

**dash¹** [dæʃ] *n* 1. çox iti/sürətli/ ani hərəkət; sıçrayış, sıçrama, cumma, tullanma; hücum, həmlə, basqın; **bold ~** cəsarətli hücum/həmlə; **to make a ~ for the door** qapıya tərəf cummaq/ sıçramaq; *The prisoner made a dash for freedom Əsir qaçmağa cəhd etdi / göstərdi;* **to make a ~ against/at the enemy** düşmənin üzərinə sürətlə hücuma keçmək; **to have a ~ at *smth.*** bir şeyi etməyə cəhd etmək/göstərmək; **to go off at a ~** sürətlə irəliyə atılmaq; 2. qətiyyət, qeyrət, əzm, səbat, möhkəmlik; inadcıllıq; **~ and courage** əzm və cəsarət; 3. *amer. id.* qaçış *(yaxın məsafəyə);* **hundred-yard ~** yüz yarda qaçış; sprint *(qısa məsafəyə);* 4. güclü zərbə; **a ~ with *one's* hand** əllə zərbə; **at (the) first ~, at one/a ~** dərhal, bir zərbədə; 5. şappıltı, şıppıltı; **the ~ of the waves** dalğanın şappıltısı; *There was a dash of rain on the windows Yağış şappıltı ilə pəncərəni döyəcləyirdi;* 6. tire, defis; cizgi, ştrix; xətt; **paralel ~** paralel xətt

**dash²** [dæʃ] *v* 1. atılmaq, tullanmaq, sıçramaq; üstünə getmək, hücum etmək, bərk qaçmaq, qaçıb getmək; **to ~ from / out of the room** otaqdan çölə/bayıra atılmaq; **to ~ along the street** küçə ilə bərk qaçmaq; *I must dash, I'm late mən qaçıb getməliyəm, gecikirəm;* 2. **(into, to, against)** tullamaq, atmaq, çırpmaq, tolazlamaq, fırıldatmaq; **to ~ a ship against the rocks** gəmini qayalara çırpmaq; **to ~ *smb.* to the ground** bir kəsi vurub yıxmaq; *The boat was dashed against the rocks Gəmi qayalara çırpıldı;* 3. vurmaq; zərbə endirmək; sındırmaq, qırmaq; **to ~ *smth.* to pieces** bir şeyi parça-parça qırmaq/sındırmaq; *The flowers were dashed by the rain Yağış gülləri/çiçəkləri xırd-xəşil etdi; The windows were dashed by the hail Dolu pəncərələri sındırdı;* 4. özünü öymək/tərifləmək, lovğalanmaq, gopa basmaq

**dash³** [dæʃ] *adv* 1. şarıltı ilə, şappıltı ilə, şıppıltı ilə; **to go ~ against the rock** şappıltı ilə / şıppıltı ilə qayaya çırpılmaq; 2. cəld, ildırım kimi, çox sürətlə

**data** ['deıtə] *n* I *(Özündən sonra fel həm təkdə həm də cəmdə işlənə bilər)* məlumat, rəqəmlər, faktlar; əsas, sübut, dəlil; **~ on word frequencies** sözlərin işlənməsinin tezliyi haqqında məlumat; The data is/are still being analused Məlumat hələ təhlil edilir

**date²** [deıt] *n* II 1. tarix, gün, vaxt; *Has the date of the next meeting been fixed? Növbəti iclasın günü/tarixi müəyyənləşdirilibmi/ dəqiqləşdirilibmi? There is no date on this document Bu sənəddə tarix yoxdur;* **~ of birth** doğum/anadan olma tarixi; *What's the date today? Bu gün ayın neçəsidir?;* 2. müddət, dövr, vaxt, zaman, əsr; **Roman ~** qədim Roma dövrü; **the ~ of youth** cavanlıq vaxtı / dövrü; **at that ~** o zamanlar / vaxtlar; *All has its date Hər şeyin öz vaxtı / zamanı var;* 3. yaş, sinn; *His date is thirty Onun otuz yaşı var;*

◊ **out-of-~** 1) köhnə, köhnəlmiş; dəbdən düşmüş; **out-of-~ ideas** köhnə / köhnəlmiş fikirlər;



**out-of-~ clothes** dəbdən düşmüş paltar; 2) vaxtı / müddəti keçmiş; **out-of-~ passport** vaxtı / müddəti keçmiş pasport; *My passport is out of date Mənim pasportumun vaxtı/müddəti keçib;* **up to ~** 1) çağdaş, müasir, dəbdə olan, dəbli; *She always wears clothes that are right up to date O, həmişə dəbdə olan paltar geyir;* **to go out of ~** köhnəlmək, dəbdən düşmək; 2) hazırkı vaxta qədər, bu günə kimi; *The problem has not been settled up to date Problem bu günə qədər həll olunmayıb;* **to bring *smth.* up to ~** bir şeyi təzələmək / təkmilləşdirmək; **to bring *smb.* up to ~** bir kəsi son məlumatlardan agah etmək, bir kəsə iş haqqında daim məlumat vermək; **to keep *smth.* up to ~** bir şeyi təkmilləşdirmək/müasir səviyyəyə qaldırmaq

**date** [deıt] *n* II *amer. d.d.* görüş; **to make a ~ with *smb.*** bir kəslə görüş təyin etmək; *I've got a date with him Mənim onunla görüşüm var*

**date** [deıt] *n* III xurma

**date²** [deıt] *v* I 1. tarix yazmaq / qoymaq; yerini və vaxtını göstərmək; **to ~ a document/a letter/a picture** sənədə/məktuba/şəklə tarix qoymaq; *Don't forget to date your letter Məktuba tarix yazmağı/qoymağı unutma/unutmayın; Her last letter was dated 24 May Onun son məktubunda 24 may tarixi yazılmışdır;* 2. tarixi olmaq, vaxtı və yeri göstərilmək; *The letter dates from London Məktub Londondan gəlib;* 3. tarix qoymaq; tarixini müəyyən etmək *(hadisənin və s.);* **to ~ *smb.'s* birth** bir kəsin doğulma tarixini müəyyən etmək/müəyyənləşdirmək; 4. tarixi müəyyən edilmək, tarixi müəyyənləşdirilmək; *These ideas date from before the war Bu fikirlər müharibədən əvvəl meydana gəlmişdir;* 5. hesab etmək, hesablamaq; *Geological time is not dated by year Geoloji vaxt illərlə hesablanmır;* 6. köhnəlmək

**date** [deıt] *v* II görüş təyin etmək *(bir kəslə)*

**dated** ['deıtıd] *adj* köhnə, köhnəlmiş, dəbdən çıxmış/düşmüş, köhnə dəbli; **~ words** köhnəlmiş sözlər; *She uses a lot of dated words O çoxlu köhnəlmiş sözlər işlədir; His clothes look awfully dated Onun paltarı dəhşətli dərəcədə köhnə dəbli görünür*

**dateless** ['deıtlıs] *adj* 1. tarixsiz, tarix yazılmamış / qoyulmamış; 2. sonsuz; əbədi; çox qədim / köhnə; **the ~ hills** çox qədim dağlar / təpələr

**date-sugar** ['deıt.ʃugəʳ] *n* xurma qəndi

**date-wine** ['deıtwaın] *n* xurma şirəsindən hazırlanmış şərab

**dative** ['deıtıv] *adj qram.* yönlük; **~ case** yönlük hal

**daughter** ['dɔ:təʳ] *n* qız, qız övladı; **my ~** mənim qızım; *I have got two daughters Mənim iki qızım var*

**daughter-in-law** ['dɔ:tərınlɔ:] *n (pl* **daughters-**['dɔ:təz-]) gəlin, oğlun arvadı

**dawdle¹** ['dɔ:dl] *n* 1. tənbəl, avara; yaramaz, əlindən iş gəlməyən, vecsiz *(adam);* 2. boş vaxt keçirmə

**dawdle²** ['dɔ:dl] *v* boş-boş vaxt keçirmək, heç bir iş görməmək, tənbəllik etmək, veyllənmək, avara gəzmək; **to ~ over *smth.*** bir şeylə tənbəl-tənbəl/həvəssiz məşğul olmaq; **to ~ along the road** yol boyu avaralanmaq/avara-avara gəzmək; **to ~ away *one's* time** vaxtını boş-boşuna keçirmək; *Stop dawdling and hurry up - we're late Avaralanma/Avaralanmayın, biz gecikirik; She doesn't get her work done because she's always dawdling O, işini görüb qurtarmır, çünki o həmişə tənbəllik edir; The boy dawdled all day in the city Oğlan bütün günü şəhərdə veylləndi*

**dawdler** ['dɔ:dləʳ] *n* 1. avara, tənbəl, əlindən iş gəlməyən; 2. ağırtərpənən adam, astagəl adam

**dawn¹** [dɔ:n] *n* 1. şəfəq; dan yeri; **at ~** dan yeri ağaranda, şəfəq söküləndə, hava işıqlananda; *Dawn is breaking Dan yeri ağarır / sökülür;* **the ~ of day** yeni günün şəfəqi; **to work from ~ till dark** dan yeri ağarandan qaranlıq düşənə kimi işləmək; *He works from dawn till dusk O, səhər tezdən toran düşənə kimi işləyir; We must start at dawn Biz dan yeri ağaranda yola düşməliyik; It's almost dawn Demək olar ki, işıqlanıb/dan yeri sökülüb;* 2. yaranma, başlanğıc, ilk çağ; **the ~ of civilization / of life** mədəniyyətin / həyatın başlanğıcı

**dawn²** [dɔ:n] *v* 1. işıqlanmaq, dan yeri ağarmaq, sübh açılmaq; 2. işıqlandırmaq, şəfəqə boyamaq *(günəşin ilk şüaları ilə);* 3. başlamaq, oyanmaq, meydana çıxmaq; *His fame is just dawning O məşhurlaşır / məşhurlaşmağa başlayır;* 4. **(on, upon)** ağla/xəyala gəlmək, oyanmaq; *It has just dawned upon me Qəflətən ağlıma gəldi; It suddenly dawned on me that I had caught the wrong train Mən qəfildən oyandım ki, (bildim ki) qatara səhv minmişəm*

**day** [deı] *n* 1. gün; **every ~** hər gün; **any ~** istənilən gün; **twice a ~** gündə iki dəfə; **all ~** bütün gün(ü); **Victory Day** Qələbə günü; *There are seven days in a week Həftədə yeddi gün var;* **a few ~s ago/before** bir neçə gün bundan əvvəl; **~ after ~, ~ by ~, ~ in and ~ out** günbəgün, gündən günə; **~ of rest, ~ off** istirahət günü; 2. vaxt, zaman, gün; dövr; **men and women of the ~** o dövrün adamları; **men of the ~** zamanın / dövrün məşhur adamları; **(in) these ~s** bu günlərdə; **in our ~s** bizim günlərdə/dövrümüzdə /zəmanəmizdə; **in the ~(s) of Shakespeare** Şekspirin dövründə/zəmanəsində; **at the present ~** bizim zəmanəmizdə, hazırkı zamanda; **in ~s to come** gələcəkdə, gələcək günlərdə; **in the ~s of old, in olden ~s** keçmiş günlərdə/zamanlarda; **some ~** bir gün/vaxt; *I can help you some day Mən sənə/sizə bir gün/vaxt kömək edə bilərəm;* 3. gündüz; **~ and night** gecə-gündüz;

by ~ gündüz; **break of** ~ işıqlanma, şəfəq, günəşin çıxması; *The day breaks İşıqlaşır, Şəfəq sökulür;*

◊ **Day of Doom/Judgement** *din.* məhşər, məhşər / qiyamət günü; **All Fools' ~, April Fool's** ~ 1 aprel *(zarafat günü);* **one ~ 1)** günlərin bir günü, bir dəfə, günlərin birində *(nağıllarda);* **2)** bu yaxın günlərdə; *I'll see you one day Bu günlərdə sizə gələcəm; Good day! Gün aydın!* **black-letter** ~ həftənin adi/iş günü; **red-letter** ~ bayram, bayram günü; **a ~ after the fair** çox gec; **a ~ before the fair** çox tez; **to name the** ~ toy gününü təyin etmək; **to keep** ***one's*** ~ dəqiq olmaq, vaxtında gəlmək; **to make a ~ of it** günü ola keçirmək; **clear / plain as** ~ gün kimi aydın;

◊ *Every day is not Sunday at. söz. Hər gün bayram olmaz*

**day-and-night** [ˈdeɪəndˈnaɪt] *adj* gecəli-gündüzlü; ~ **duty** gecəli-gündüzlü növbə

**daybreak** [ˈdeɪbreɪk] *n* şəfəq; **at** ~ dan yeri ağararkən / ağaranda, şəfəq sökülərkən/söküləndə, hava işıqlaşanda

**day-dream** [ˈdeɪdri:m] *n* xəyal, şirin xəyal, xəyalat; xülya, arzu, xam xəyal, xəyalpərəstlik

**day-dreamer** [ˈdeɪ.dri:məʳ] *n* xəyalçı, xəyalpərəst *(adam)*, fantaziyaçı

**day-labour** [ˈdeɪ.leɪbəʳ] *n* günəmuzd iş

**day-labourer** [ˈdeɪ.leɪbərəʳ] *n* günəmuzdçu, günəmuzd işləyən / fəhlə

**daylight** [ˈdeɪlaɪt] *n* **1**. gündüz işığı; günəş işığı; **in broad ~ 1)** gün işığında, parlaq işıqda; **2)** *məc.* açıq, camaat içində/qarşısında; **2**. şəfəq, gün; **at** ~ dan yeri ağaranda/ağararkən, şəfəq söküləndə/sökülərkən, hava işıqlananda; **to get up at** ~ dan yeri söküləndə/sökülərkən qalxmaq; **before** ~ şəfəq sökülməzdən əvvəl; **to work from ~ till dark** səhərdən axşama kimi işləmək; 3. deşik *(işıq gəlmək üçün)*, işıq yeri, baca; **4**. açıqlıq, aşkarlıq; xəbərdar/ məlumatı olma; **to let ~ into** ***smth.*** bir şeyə aşkarlıq gətirmək, bir şeyi aşkar etmək; **to throw ~ upon** ***smth.*** bir şeyi aydınlaşdırmaq / işıqlandırmaq;

◊ **as clear as** ~ gün kimi aydın; **to see** ~ vəziyyətdən çıxış yolu görmək; **to burn** ~ *arx.* **1)** gündüz şam/işıq yandırmaq; **2)** boş yerə vaxt itirmək, boş yerə güc sərf etmək

**daylight lamp** [ˈdeɪlaɪtˈlæmp] *n* gündüz işığı verən lampa

**daylight-saving** [ˈdeɪlaɪt.seɪvɪŋ] *n* yayvaxtına keçmə, saatların əqrəblərini bir saat qabağa çəkmə *(dövlət miqyasında)*

**daylong**[1] [ˈdeɪlɔŋ] *adj* bütün gün davam edən, günuzunu davam edən; **a ~ meeting** bütün gün davam edən iclas

**daylong**[2] [ˈdeɪlɔŋ] *adv* bütün günü, günuzunu

**dayman** [ˈdeɪmən] *n (pl* **-men** [-mən] günəmuzdçu, günəmuzd işləyən *(adam)*

**day-school** [ˈdeɪsku:l] *n* gündüz məktəbi

**day-shift** [ˈdeɪʃɪft] *n* gündüz növbəsi

**day-star** [ˈdeɪsta:ʳ] *n* **1**. dan ulduzu; **2**. *şair.* günəş

**day's-work** [ˈdeɪzwə:k] *n* gündəlik iş, bir gündə görülən iş; **not to do a** ~ əlini ağdan qaraya vurmamaq; boş-boş/boş-bikar gəzmək, heç bir iş görməmək

**day-ticket** [ˈdeɪ.tɪkɪt] *n* bir sutka etibarlı olan, ikibaşa bilet

**day-time** [ˈdeɪtaɪm] *n* gün; **in the** ~ gündüz, gündüz vaxtı

**day-to-day** [ˈdeɪtəˈdeɪ] *adj* gündəlik, hərgünkü, adi, həmişəki; **in our ~ life** bizim gündəlik həyatımızda

**day-wages** [ˈdeɪ.weɪdʒɪz] *n pl* günəmuzd əmək haqqı

**daze**[1] [deɪz] *n* heyrət, təəccüb; donma, donub / quruyub / mat qalma *(təəccübdən, qorxudan və s.); He was in a daze O, heyrət içərisində donub qalmışdı*

**daze**[2] [deɪz] *v* heyrətləndirmək, heyrətə salmaq, təəccübləndirmək; **to be ~d** donub qalmaq, mat qalmaq; *After the accident John was dazed Qəzadan sonra Con donub qalmışdı*

**dazed** [ˈdeɪzɪd] *adj* heyrətli, heyran; sarsıdılmış, çaşdırılmış, karıxdırılmış

**dazzle**[1] [ˈdæzl] *n* **1**. qamaşdırma, gözləri qamaşdırma/qamaşma; **2**. gözqamaşdırıcı parıltı; **3**. parlaqlıq; **the ~ of light** işığın parlaqlığı

**dazzle**[2] [ˈdæzl] *v* **1**. qamaşdırmaq; *The sun dazzles the eyes Günəş gözləri qamaşdırır; The lights of the car dazzled me Maşının işıqları mənim gözlərimi qamaşdırdı*; **2**. *məc.* valeh /heyran etmək; *The splendid room dazzled the young girl Dəbdəbəli / Cah-calallı otaq gənc qızı valeh etdi*

**dazzling** [ˈdæzlɪŋ] *adj* gözqamaşdırıcı; valehedici, heyranedici

**deacon** [ˈdi:kn] *n* **1**. keşiş; **2**. dyakon *(aşağı dərəcəli keşiş)*

**deaconess** [ˈdi:kənɪs] *n* **1**. dyakon arvadı; **2**. diakon qadın

**deaconhood** [ˈdi:knhud] *n* **1**. dyakon vəzifəsi, diakonluq; **2**. *top.i* dyakonlar

**deaconship** [ˈdi:kənʃɪp] *n* = **deaconhood**

**deactivate** [di:ˈæktɪveɪt] *v hərb.* **1**. buraxmaq, ləğv etmək; **2**. tərxis etmək; **3**. zərərsizləşdirmək *(minanı);* **4**. dezaktivasiya etmək, dezaktivləşdirmək

**dead**[1] [ded] *n* **1**. **the** ~ *top.i* ölülər, ölmüşlər; rəhmətliklər; **the ~ and the living** ölülər və dirilər; *We carried the dead and the wounded off the battlefield Biz ölənləri və yaralıları döyüş meydanından daşıyıb apardıq; Do the dead ever come back to life? Ölülər heç həyata qayıdırmı?* 2. durğunluq/ tənəzzül dövrü; **the ~ of winter** qışın axırlarında; **in the ~ of night** gecədən xeyli keçmiş, gecənin dərinliyində



**dead**[2] [ded] *adj* **1**. ölü, ölmüş; gəbərmiş, murdar olmuş *(heyvan haq.);* **a ~ man** ölmüş adam; **a ~ cat** gəbərmiş pişik; ~ **languages** ölü/ölmüş dillər *(ancaq yazılı abidələrə əsasən məlum olan dillər);* ~ **body** meyit, nəş, cənazə, cəsəd; cəmdək, leş *(heyvan haq.);* ~ **news** ölüm xəbəri, qara xəbər; **2**. solğun, cansız; ölü kimi; ~ **eyes** solğun/cansız gözlər; **3**. məhv/həlak/tələf /heç/ puç olmuş; **4**. solmuş, soluq, rəngi solmuş; qurumuş; ~ **leaves** solmuş / qurumuş yarpaqlar; **5**. cansız; ~ **matter** cansız materiya; **6**. məhsul verməyən, münbit olmayan; ~ **sand/ soil** məhsul verməyən qumsal torpaq; 7. dərin, bərk ~ **sleep** dərin/bərk yuxu; ~ **hush/silence** dərin sükut; **8**. keyləşmiş, keyimiş; hissini itirmiş; *My fingers have gone dead Mənim barmaqlarım keyləşib/keyiyib;* **to be ~ with hunger** acından ölmək, bərk acmaq; **to be ~ with cold** soyuqdan ölmək; *I'm dead with cold Mən soyuqdan ölürəm;*

◊ ~ **short 1)** dəqiq atəş; **2)** snayper *(mahir / sərrast nişançı);* **more ~ than alive** bərk yorulmuş; *Dead men don't bite / don't tell tales ≅ Ölülər danışmırlar*

**dead**[3] [ded] *adv* **1**. tamamilə, tam, çox, son dərəcə, ölü kimi; ~ **calm** tam sakitlik; ~ **drunk** tamamilə sərxoş; *d.d.* lülqənbər; ~ **ripe** tam dəymiş/yetişmiş; ~ **small** çox/ son dərəcə balaca, bambalaca; ~ **tired** son dərəcə yorulmuş; **to cut** ***smb.*** ~ əsla diqqət/fikir verməmək, tam laqeyd olmaq/qalmaq; **to drop/to fall ~ on the floor** ölü kimi döşəməyə yıxılmaq; **2**. dəqiq, düz; birbaşa; tam; ~ **against** tam əleyhinə; ~ **ahead** birbaşa/düz irəli; **in an hour** ~ düz bir saatdan sonra; **coming ~ towards us** birbaşa / düz biz tərəfə gələn

**dead-born** [ˈdedbɔ:n] *adj* ölü doğulmuş

**dead-clothes** [ˈdedˈklouðz] *n* ölü paltarı, ölüyə geydirilən paltar *(xristianlarda)*

**deaden** [ˈdedn] *v* **1**. öldürmək; kütləşdirmək; keyləşdirmək; **to ~ the nerve of the tooth** dişin əsəbini öldürmək/keyləşdirmək; **to ~ the pain** ağrını keyləşdirmək; *Thick walls deaden noise Qalın divarlar səsi kütləşdirir;* **to ~** ***smb.'s*** **feelings** bir kəsin hisslərini keyləşdirmək; **2**. keyləşmək, hissiyatsız olmaq; **3**. azaltmaq, zəiflətmək, batırmaq; **to ~ the force of a blow** zərbənin gücünü azaltmaq / zəiflətmək; **to ~ a sound** səsi batırmaq

**dead end**[1] [ˈdedˈend] *n* **1**. dalan; **2**. *məc.* çıxılmaz / çətin vəziyyət; *We've come to a dead end in our efforts to reach agreement Razılıq əldə etmək üçün bizim cəhdlərimiz / səylərimiz fayda vermir*

**dead end**[2] [ˈdedˈend] *adj* çətin / çıxılmaz vəziyyətə düşmüş; faydasız, gələcəyi olmayan; **to be at a** ~ çətin vəziyyətdə olmaq; **to come to a** ~ çətin/çıxılmaz vəziyyətə düşmək; **a ~ job** gələcəyi olmayan məşğuliyyət; **a ~ career** perspektivi / gələcəyi olmayan karyera

**deadfall** [ˈdedfɔ:l] *n* tələ, duzaq, tor, cələ

**dead-hearted** [ˈdedha:tɪd] *adj* daşürəkli, mərhəmətsiz, hissiz, insafsız

**dead heat** [.dedˈhi:t] *n id.* **1**. eynivaxtlı finiş *(xüs. qaçışda);* **2**. xalların eyniliyi; **3**. heç-heçə; *The race was a dead heat, and the first prize was divided Qaçış heç-heçə qurtardı və birinci priz bölündü*

**dead-house** [ˈdedhaus] *n* morq, meyitxana, ölüxana

**deadline** [ˈdedlaɪn] *n* sərhəd; hədd, hüdud; son hədd / nöqtə / hüdud; bir işin görülməsi üçün müəyyənləşdirilmiş müddət; *I hope we can finish compiling this dictionary before the deadline Mən ümid edirəm ki, biz bu lüğətin tərtibini müəyyənləşdirilmiş vaxtdan əvvəl qurtara bilərik;* **the ~ for the submission of a document** sənədin təqdim edilməsi üçün son hədd

**deadlock**[1] [ˈdedlɔk] *n* ölü nöqtə; dalan; çıxılmaz vəziyyət; durğunluq; **to come to a** ~ çıxılmaz vəziyyətə düşmək; **to bring** ***smb.*** **to a** ~ bir kəsi çıxılmaz vəziyyətə salmaq; **to be at a** ~ çıxılmaz vəziyyətdə olmaq; **to break / to overcome the** ~ çıxılmaz vəziyyətdən çıxmaq

**deadlock**[2] [ˈdedlɔk] *v* çıxılmaz vəziyyətə düşmək; bir kəsi çıxılmaz vəziyyətə salmaq

**deadly**[1] [ˈdedlɪ] *adj* **(-ier, -iest) 1**. öldürücü, ölümcül, məhvedici, ölümlə nəticələnən, məhvedici, ölümsaçan; ~ **blow/poison** öldürücü zərbə/zəhər; ~ **weapon** ölümsaçan silah; ~ **wound** öldürücü yara; ~ **disease** məhvedici /öldürücü xəstəlik; **2**. bağışlanılmaz, çox ağır; ~ **sin** bağışlanılmaz günah; **the seven ~ sins** yeddi bağışlanılmaz günah; **3**. qəddar, rəhmsiz, amansız; ~ **enemy** amansız/qəddar düşmən; ~ **combat** amansız döyüş; ~ **fight** amansız vuruş; **4**. dəhşətli; ~ **faintness** dəhşətli zəiflik; **5**. dözülməz, çox darıxdırıcı; ~ **dullness** dözülməz üzüntü/darıxma; **a ~ conversation** çox darıxdırıcı söhbət

**deadly**[2] [ˈdedlɪ] *adv* **1**. son/hədsiz dərəcədə; ~ **pale** son dərəcə solğun; ~ **tired** sonsuz dərəcədə yorğun; ~ **cold** həddən artıq / hədsiz dərəcədə soyuq; **2**. ölümcül halda / dərəcədə, ölümcül

**dead man's finger** [ˈdedmænzˈfɪŋgəʳ] *n bot.* səhləb *(ot bitkisi)*

**deadness** [ˈdednɪs] *n* **1**. ölüm; **2**. süstlük, ətalət, ölüvaylıq, kəsalət, cansızlıq; ~ **to** ***smth.*** bir şeyə qarşı tam biganəlik; **3**. yeknəsəqlik, bircürəlik; monotonluq, maraqsızlıq

**deadpan**[1] [ˈdedpæn] *n* ifadəsiz sifət

**deadpan**[2] [ˈdedpæn] *adj* ifadəsiz; solğun; **a ~ face** ifadəsiz sifət; ~ **comedy** solğun komediya

**dead-water** [ˈded.wɔ:təʳ] *n* durğun su

**dead-wind** [ˈded.wɪnd] *n* qarşıdan əsən külək

**dead-wood** [ˈdedwud] *n* **1**. qurumuş ağaclar; **2**. çürüntü, çürük şey; köhnə-küruş, cır-cındır; yaramaz bir şey

**dead-work** [ˈdedˈwə:k] *n* **1**. *d.d.* hal-hazırda görü-

lən iş; 2. *dən. arx.* yüklənmiş gəminin suyun üstündəki hissəsi

**deaf[1]** [def] *n*: *the ~ top. i* karlar

**deaf[2]** [def] *adj* (-er, -est) 1. kar; ağıreşidən; **to be ~ in one ear** bir qulaqdan kar olmaq; *She was born completely deaf O, anadan kar doğulub; He's getting deafer in his old age Qocalığında onun qulağı getdikcə pis eşidir;* **~ people** kar adamlar; **a special school for the ~** karlar üçün xüsusi məktəb; **~ of an / one ear** bir qulaqdan kar; *He is deaf in his left ear O, sol qulağından kardır;* **~ and dumb** lal-kar; 2. qulaq asmayan, əhəmiyyət verməyən, etina etməyən; **~ to advice** məsləhətə qulaq asmayan;

◊ **~ nut** 1) çürük fındıq; 2) boş /mənasız iş; **to turn a ~ ear to** saymamaq, nəzərə almamaq, məhəl qoymamaq, etinasızlıq göstərmək; qulaqardına vurmaq; **~ as an adder /a beetle/a stone** tamam kar

**deaf-and-dumb** [ˈdefənˈdʌm] *adj* lal-kar; lal-karlar üçün olan / nəzərdə tutulan; **~ alphabet** lal-karlar üçün əlifba

**deaf-dumbness** [ˈdef.dʌmnɪs] *n* lal-karlıq

**deafen** [ˈdefn] *v* 1. kar etmək, qulaq batırmaq, qulağını batırmaq; *This noise will deafen us all! Bu səs bizim hamımızı kar edəcək;* 2. batırmaq *(səsi)*, azaltmaq *(səsi)*; 3. səsi izolyasiya etmək, səskeçirməz hala salmaq

**deafening[1]** [ˈdefnɪŋ] *n* səsi izolə etmək üçün material

**deafening[2]** [ˈdefnɪŋ] *adj* qulaqbatırıcı, qulaqbatıran, çox bərk; **~ applause** qulaqbatıran alqış; *Please turn the radio down, the noise is deafening Zəhmət olmasa, radionun səsini azalt / azaldın, səs qulaq batırır*

**deafeningly** [ˈdefnɪŋlɪ] *adv* karedəcək, çox bərk, çox uca *(səs)*; **~ loud** karedəcək dərəcədə uca *(səs haq.)*

**deaf-mute[1]** [ˈdefˈmju:t] *n* lal-kar

**deaf-mute[2]** [ˈdefˈmju:t] *adj* lal-kar

**deafness** [ˈdefnɪs] *n* karlıq

**deal[1]** [di:l] *n* I 1. müəyyən miqdar, hissə; **a good ~ of money** xeyli miqdar pul; **a good ~ of time** xeyli vaxt; *We have a good deal of time Bizim xeyli / çox vaxtımız var;* **a good ~ better / worse** xeyli yaxşı / pis; **to know a good ~** xeyli yaxşı bilmək; **to walk a good ~** xeyli gəzmək; 2. *d.d.* çox miqdar, yığın, topa, qalaq, çoxlu, bir yığın; *There will be a good deal of trouble after that Ondan sonra bir yığın narahatçılıq olacaq; There's a good deal of truth in it Bunda xeyli həqiqət var; He feels a good deal better O özünü xeyli yaxşı hiss edir;* 3. kart paylama; *Whose deal is it? My deal Kart paylamaq kimin növbəsidir? Mənim növbəmdir*

**deal** [di:l] *n* II saziş, razılaşma; sövdə, alver; **fair ~** 1) təmiz sövdə; 2) vicdanlı hərəkət; 3) ədalətli münasibət; **rough / raw ~** çox ədalətsiz münasibət; **to give *smb.* a square ~** bir kəsə vicdanla yanaşmaq; **to make / to do a ~ with *smb.*** bir kəslə sövdələşmək; bir kəslə razılıq əldə etmək; bir kəslə gizli razılığa gəlmək; *Well, that's a deal Oldu! Razıyam!*

**deal** [di:l] *n* III *pl* küknar və ya şam taxtası; **standard ~s** standart taxtalar; **yellow ~s** taxta-şalban

**deal[2]** [di:l] *adj* 1. şam, küknar; **~ apple** şam / küknar qozası; 2. şam / küknar ağacından qayrılmış / istehsal edilmiş; **a ~ table** şam taxtasından qayrılmış stol; **a ~ floor** şam və ya küknar taxtasından döşəmə

**deal[3]** [di:l] *v (pt, pp* **dealt** [delt]) 1. bölmək, paylamaq, vermək, təmin etmək *(həm də* **to ~ out***); The money must be dealt fairly Pul düz /ədalətlə bölünməlidir;* **to ~ out gifts** hədiyyələr vermək/paylamaq; 2. paylamaq *(qumar kağızlarını)*; **to ~ *(out)* cards** kart paylamaq; *It is your turn to deal Kartı paylamaq indi sənin/sizin növbəndir/növbənizdir;* 3. endirmək, vurmaq *(zərbə)*; **to ~ *smb.* a blow, to ~ a blow at *smb.*** 1) bir kəsə zərbə endirmək; 2) bir kəsə əzab-əziyyət vermək; **to ~ a blow at hopes** ümidləri boşa çıxarmaq; 4. **(in, with)** məşğul olmaq *(bir şeylə)*; **to ~ in politics** siyasətlə məşğul olmaq; **to ~ in leather** dəri alveri ilə məşğul olmaq; 5. **(with)** əlaqəsi olmaq *(bir şeylə, bir kəslə)*, məşğul olmaq; **to ~ with the matter** işlə məşğul olmaq; *Science deals with facts Elm faktlarla məşğul olur;* 6. **(with)** bəhs etmək; *Arithmetic deals with numbers Hesab rəqəmlərdən bəhs edir; The next chapter of this book deals with verbs Bu kitabın növbəti fəsli fellərdən bəhs edir;* 7. müzakirə etmək; **to ~ with** müzakirə etmək, baxmaq *(işə)*; **to ~ with a case** *hüq.* işə baxmaq; *The committee will deal with this problem Komitə bu problemi müzakirə edəcək;* 8. **(with)** qarşılaşmaq; mübarizə aparmaq; **to ~ with a difficulty** çətinliyə qarşı mübarizə aparmaq, çətinliyi aradan qaldırmağa çalışmaq; **to ~ with fire** yanğına qarşı mübarizə aparmaq; **to ~ with an attack** hücumu dəf etmək; 9. **(with)** keçinmək, dolanmaq; rəftar etmək; özünü aparmaq *(bir kəsə qarşı)*; **to ~ cruelly with *smb.*** bir kəsə qarşı qəddarlıq etmək / amansız olmaq

**dealer** [ˈdi:ləʳ] *n (adət.* **the ~**) 1. qumar kağızını paylayan; 2. alverçi, tacir; ehtikarçı, spekulyant; **a drug ~** narkotik maddələr alverçisi; **retail/wholesale ~** pərakəndə/topdansatışla məşğul olan alverçi; **~ in old clothes** köhnə paltar alverçisi; **a ~ in stolen goods** oğurluq mal alıb-satan; 3. birjaçı, birja dəllalı; 4. **plain ~** düz/səmimi adam; **double ~** ikiüzlü /riyakar adam

**dealing** [ˈdi:lɪŋ] *n* 1. bölmə, bölüşdürmə, paylaşdırma; bölgü; 2. paylama *(qumar kağızını)*; 3. endirmə, vurma *(zərbə)*; 4. *adətən pl* 1) işgüzar əlaqə; münasibət; *Have no dealings with him Ona baş qoşma, Onunla münasibət saxlama;* 2)



ticarət razılaşması/sövdəsi; **to have ~s with *smb.*** bir kəslə ticarət əlaqəsi olmaq/ticarət etmək; 5. rəftar, hərəkət, davranış; **honest ~** vicdanlı / düz rəftar; **crooked ~** namussuz/şərəfsiz rəftar/hərəkət; **double ~** ikiüzlülük, riyakarlıq

**dealt** [delt] **to deal** *felinin pt və pp formaları*

**dean** [di:n] *n* 1. dekan *(fakültədə)*; **~ of the faculty of law** hüquq fakültəsinin dekanı; 2. tərbiyəçi müəllim *(Oksford və Kembric universitetlərində)*; 3. dekan *(yepiskopdan aşağı dini rütbə)*; 4. kompaniyanın başçısı

**deanery** [ˈdi:nərɪ] *n* 1. dekanlıq, dekan vəzifəsi; 2. dekanat *(fakültə rəhbərliyi)*; 3. dekanlığın yerləşdiyi otaq

**deanship** [di:nʃɪp] *n* dekan vəzifəsi

**dear[1]** [dɪəʳ] *n* 1. əziz, sevimli, istəkli *(müraciət məqamında işlədilir)*; *My dear Əzizim;* 2. sevgili; **with his ~** öz sevgilisi ilə; *He went with his dear O, öz sevgilisi ilə getdi*

**dear[2]** [dɪəʳ] *adj* (-er, -est) 1. əziz, sevimli, istəkli; doğma; *Dear father/mother Əziz/İstəkli/ata/ana;* **~ friend** əziz istəkli/sevimli dost; **~ land** doğma torpaq; **a very ~ friend of mine** mənim ən əziz dostlarımdan biri; **to be ~ to *smb.*** bir kəs üçün əziz olmaq; 2. çox hörmətli *(müraciət məqamında işlənərkən)*; *Dear Sir Çox hörmətli cənab;* 3. gözəl, qəşəng, xoşagələn, gözoxşayan, sevimli, çox yaxşı; **a ~ little thing** gözəl / qəşəng / gözoxşayan şey; 4. baha, baha qiymətli; **~ furs/pictures** baha qiymətli xəzlər / şəkillər; *That's too dear for me Bu mənim üçün çox bahadır;* 5. yüksək *(qiymət haq.)*; **~ price** yüksək qiymət; **to pay too ~ a price for *smth.*** bir şeyi yüksək qiymətə almaq;

◊ **for ~ life** bütün gücü ilə, ölüm-dirim; **to fight for ~ life** ölüm-dirim mübarizəsi aparmaq; **to run / to flee for ~ life** var gücü ilə qaçmaq, canını qurtarmaq üçün qaçmaq, qaçıb canını qurtarmaq

**dear[3]** [dɪəʳ] *adv* baha *(həm də məc.)*; **to sell ~** baha satmaq; **to cost ~** baha başa gəlmək/olmaq; *If you want to make money, buy cheap and sell dear Əgər pul qazanmaq istəyirsənsə/istəyirsinizsə ucuz alıb, baha sat / satın*

**dear[4]** [dɪəʳ] *int.* Təəccüb, nifrət, arzu və s. ifadə edir: *Dear me! Oh dear! Dear heart! Bay Allah! Belə-belə işlər! Doğrudanmı?! Ola bilməz! Oh dear, my head aches! Ox, başım necə ağrıyır; Dear knows Allah bilir!*

**dear-bought** [ˈdɪəˈbɔ:t] *adj* baha qiymətə alınmış, baha başa gələn

**dearly** [ˈdɪəlɪ] *adj* 1. sevə-sevə, sevgi ilə, şəfqətlə, nəvazişlə; qızğın, alovlu, hərarətlə, atəşin; **to love ~** atəşin bir tərzdə sevmək; *He loves his wife dearly O, arvadını çox sevir;* 2. baha başa gələn, baha qiymətə başa gələn; *She paid dearly for her mistake Səhvi ona çox baha başa gəldi; Victory was dearly bought Qələbə baha başa gəldi*

**dearness** [ˈdɪənɪs] *n* 1. zəriflik, incəlik; mehribanlıq; məhəbbət, sevgi, eşq; yaxınlıq, dostluq; 2. bahalıq, yüksək qiymət

**dearth** [də:θ] *n* 1. azlıq, çatmama, əskik gəlmə, kəsir, əskik; 2. aclıq; **in time of ~** aclıq vaxtı / zamanı

**death[1]** [deθ] *n* 1. ölüm; **natural ~** təbii / öz əcəli ilə ölüm; **violent ~** qətl, zorakı ölüm; **~ by drowning** suda boğub öldürmə; **a question of life and ~** ölüm-dirim məsələsi; **to *one's* ~** ölənə kimi, həyatının sonuna qədər; son nəfəsinə qədər/kimi; **to die a hero's ~** qəhrəman kimi ölmək; **to meet *one's* ~** ölmək, məhv olmaq; **to beat *smb.* to ~** bir kəsi ölənə kimi/qədər döymək; **to be frozen/starved to ~** soyuqdan / acından ölmək; **to raise *smb.* from ~** bir kəsi ölümdən qurtarmaq / həyata qaytarmaq; **a sudden ~** qəfil ölüm; **a horrible ~** dəhşətli ölüm; **a peaceful ~** rahat ölüm; *His mother's death was a shock to him Anasının ölümü onun üçün zərbə oldu;* 2. ölgünləşmə, cansızlaşma, keyləşmə; **the ~ of the tissues** toxumaların ölgünləşməsi; 3. ölüm cəzası; **to suffer ~ /the penalty of ~** edam edilmək; **to put *smb.* to ~** bir kəsi edam etmək; 4. məhv/tələf olma; ölüm; **spiritual ~** mənəvi ölüm; *This will be the death of me Bu məni məhv edəcək/qəbrə aparacaq;* **everlasting / eternal ~** əbədi əzab-əziyyət/məşəqqət; 5. axır, son; yox/qeyb olma; məhv olma; **~ of a memory** yaddaşı itirmə, yaddaşın itməsi; **the ~ of hopes /plans** ümidlərin /planların məhv olması / boşa çıxması; **to hate *smb.* to ~** bir kəsdən zəndeyi-zəhləsi getmək; **to laugh oneself to ~** nəfəsi kəsilənə qədər gülmək, gülüb əldən getmək; qəşş etmək;

◊ **at ~'s door** can üstə, bir ayağı qəbirdə; **to be at ~'s door** bir ayağı qəbirdə olmaq; *That very sick man is at the death's door O, ağır xəstə kişinin bir ayağı qəbirdədir;* **to be in the jaws of ~** ölümün pəncəsində olmaq; *Death knocks at the door Ölüm qapını döyür*

**death[2]** [deθ] *adj* ölüm; **~ certificate** ölüm haqqında şəhadətnamə; **~ angel** ölüm mələyi, Cəbrail; **~ cry** ölümqabağı qışqırıq; **~ hour** ölüm anı; **~ sentence** ölüm hökmü; **~ sand** radioaktiv toz

**death-agony** [ˈdeθˈægənɪ] *n* can vermə, ölümqabağı əzab

**deathbed** [ˈdeθbed] *n* ölüm yatağı; *He forgave the girl on his deathbed O, qızı ölüm yatağında bağışladı / əfv etdi*

**death-bell** [ˈdeθbel] *n* matəm zəngi

**death-bird** [ˈdeθbə:d] *n* 1. leşyeyən quş; 2. ölüm xəbəri verən quş

**death-blow** [ˈdeθblou] *n* öldürücü zərbə *(həm də məc.)*; **~ to one's hopes** bütün ümidlərin boşa çıxması

**death-cold** [ˈdeθkould] *n* meyit kimi soyuq

**death-damp** ['deθdæmp] *n* ölüm təri
**death-day** ['deθ'deı] *n* 1. ölüm günü; 2. ölümün ildönümü, il
**deathful** ['deθful] *adj* 1. ölümlə hədələyən, ölümcül, çox təhlükəli; under ~ **conditions** həyat üçün təhlükəli vəziyyətdə; 2. ölü; ~ **stillness** ölü sükut
**death-hunter** ['deθ.hʌntəʳ] *n* soyğunçu, çapqınçı *(dava meydanında ölüləri, yaralıları və ya müharibə rayonlarında əhalini soyan adam)*
**death knell** ['deθ'nel] *n* dəfn zəngi; **to sound the ~ for** *smth.*, **to sound the ~ of** *smth.* bir şeyin məhv olması haqqında xəbər vermək
**deathless** ['deθlıs] *adj* ölməz, əbədiyaşar, əbədi; ~ **fame / name** ölməz şöhrət / ad
**deathlike** ['deθlaık] *adj* ölüm kimi, ölümə oxşar, ölümə bərabər, amansız; ~ **silence** tam sakitilik
**deathly**[1] ['deθlı] *adj* öldürücü, ölümcül, ölümlə nəticələnən; fəlakətli; tam; ~ **wound** öldürücü yara; **a ~ stillness** tam sakitlik
**deathly**[2] ['deθlı] *adv* 1. ölümcül halda, ölümcül; 2. hədsiz dərəcədə, son dərəcə; **to be ~ tired** hədsiz dərəcədə/son dərəcə yorğun olmaq; *I am deathly tired Mən bərk yorğunam;* ~ **pale** son dərəcə / ölü kimi solğun
**death-penalty** ['deθ.penltı] *n* ölüm cəzası
**death-rate** ['deθreıt] *n* ölüm faizi, ölənlərin sayı, ölüm miqdarı
**death-rattle** ['deθ.rætl] *n* ölümqabağı xırıltı
**death's-head** ['deθshed] *n* kəllə *(ölüm simvolu)*
**death-sick** ['deθsık] *adj* 1. çox / hədsiz dərəcədə zəif; 2. ölümcül xəstə
**deathsman** ['deθsmən] *n (pl* **-men** [mən]) *arx.* cəllad
**death-struck** ['deθstrʌk] *adj* ölümcül xəstə / yaralı
**death-wound** ['deθwund] *n* ölümcül yara
**debacle** [deı'ba:kl] *n fr.* məğlubiyyət, dağılma, alt-üst olma; **to suffer a ~** məğlub olmaq; **a political ~** siyasi məğlubiyyət; **an economic ~** iqtisadi məğlubiyyət
**debar** [dı'ba:] *v* buraxmamaq; mane olmaq; rədd etmək; məhrum/qadağan/yasaq etmək; **to ~ passage** keçməyə imkan verməmək, yolunu kəsmək; **to ~** *smb.* **from the joys of life** bir kəsi həyatın sevincindən məhrum etmək; **to ~** *smb.* **from voting** bir kəsi səsvermə hüququndan məhrum etmək; *Convicted criminals are debarred from voting in election Məhkum edilmiş cinayətkarlar seçkidə səsvermə hüququndan məhrum edilir; People in jeans were debarred from the club Cins paltar geyənlər kluba buraxılmırdı*
**debase** [dı'beıs] *v* 1. keyfiyyəti / dəyəri azaltmaq; xarab etmək; **to ~** *one's* **character** öz adını / şöhrətini korlamaq; **to ~ the coinage** məzənnəni aşağı salmaq *(valyuta haq.);* 2. ləyaqətini alçaltmaq / azaltmaq; biabır / rüsvay etmək; *You debase yourself by telling such lies Belə yalanlar söyləməklə sən/ siz öz ləyaqətini / ləyaqətinizi alçaldırsan/alçaldırsınız*
**debased** [dı'beıst] *adj* 1. aşağı salınmış, endirilmiş; xarab edilmiş, korlanmış; 2. alçaldılmış, hörmətdən salınmış, təhqir edilmiş
**debasement** [dı'beısmənt] *n* 1. aşağı salınma / endirilmə; xarab etmə; 2. alçaldılma, hörmətdən salma, təhqir etmə
**debatable** [dı'beıtəbl] *adj* mübahisəli, mübahisə doğuran, mübahisəyə səbəb olan; ~ **problem** mübahisə doğuran problem; **a ~ statement** mübahisəli bəyanat; **a ~ border area** mübahisəli sərhəd zonası; ~ **ground / land** mübahisəyə səbəb olan torpaq / ərazi
**debate**[1] [dı'beıt] *n* 1. diskussiya, müzakirə; ~ **on the report** məruzə üzrə müzakirə; **rules of ~** müzakirənin qaydası; **to open the ~** müzakirəni açmaq; *After a long debate, the House of Commons approved the bill Uzun müzakirədən sonra nümayəndələr palatası qanun layihəsini bəyəndi;* 2. polemika, mübahisə, bəhs, deyişmə, çəkişmə, münaqişə; **beyond ~** mübahisəsiz, şəksiz, şübhəsiz *(olaraq);* **after much ~** uzun mübahisədən / deyişmədən sonra; **to hold ~ with oneself** götür-qoy etmək, dönə-dönə fikirləşmək; 3. **(the ~s)** *pl* parlament iclasları haqqında rəsmi hesabat
**debate**[2] [dı'beıt] *v* 1. müzakirə etmək; **to ~ a question** məsələ müzakirə etmək; *What are they debating about? Onlar nəyi müzakirə edirlər? We're just debating what to do next Biz bu saat sonra nə edəcəyimizi müzakirə edirik; They debated closing the factory Onlar fabrikin bağlanması məsələsini müzakirə etdilər;* 2. götür-qoy etmək, ölçüb-biçmək, mülahizə yürütmək; **to ~ a matter in** *one's* **mind** hər hansı bir məsələni öz beynində ölçüb-biçmək / götür-qoy etmək; **to ~ with oneself** bir şeyi özlüyündə götür-qoy etmək / ölçüb-biçmək; *I'm just debating whether to go or stay d.d. Mən bilmirəm nə edim, görəsən gedim ya qalım*
**debater** [dı'beıtəʳ] *n* müzakirə iştirakçısı, müzakirədə iştirak edən; mübahisəçi; **skilful ~** mahir / məharətli / qabil / bacarıqlı mübahisəçi
**debating-society** [dı'beıtıŋsə'saıətı] *n* müzakirə / mübahisə klubu
**debauch**[1] [dı'bɔ:tʃ] *n* 1. içki məclisi, kef, eyş-işrət, əyyaşlıq; **the night's ~** gecə içki məclisi / eyş-işrəti; 2. azğınlıq, qudurğanlıq, hərki-hərkilik; əxlaqsızlıq; mənəvi pozğunluq
**debauch**[2] [dı'bɔ:tʃ] *v* 1. əxlaqını pozmaq, yoldan çıxartmaq, pis yola çəkmək; mənəviyyatını pozmaq; zorlamaq, qızlığı almaq; *He has debauched many innocent girls O, çox məsum qızları yoldan çıxarıb / zorlayıb;* 2. pis yola çəkmək, azdırmaq, tovlamaq; başdan/yoldan çıxartmaq; 3. korlamaq, xarab etmək; **to ~** *smb.'s* **taste** bir kəsin zövqünü korlamaq
**debauched** [dı'bɔ:tʃt] *adj* 1. əxlaqsız, pozğun, əxlaqı pozulmuş, tərbiyəsiz; yolunu azmış; **a ~ man** əxlaqsız / pozğun / tərbiyəsiz adam; **a ~ life** pozğun həyat; 2. zorlanmış, bəkarəti alınmış
**debauchee** [.debɔ:'tʃi:] *n* əxlaqsız, pozğun *(adam)*
**debaucher** [dı'bɔ:tʃəʳ] *n* əxlaqsız, pozğun *(adam)*, azdıran, aldadan, tovlayan, tamaha salan, başdan çıxaran *(adam)*
**debauchery** [dı'bɔ:tʃərı] *n* 1. içki məclisi, eyş-işrət; 2. sərxoşluq; acgözlük, qarınquluqluq; nəfsini saxlamama; hövsələsizlik, ehtiyatsızlıq; 3. əxlaqsızlıq, pozğunluq



**debenture** [dı'bentʃəʳ] *n* 1. borc iltizamı; 2. səhmdar / aksioner cəmiyyətinin istiqrazı; 3. *arx.* dövlət istiqraz vərəqəsi
**debilitate** [dı'bılıteıt] *v tib.* zəiflətmək; zəif salmaq, zəifləşdirmək; əldən/taqətdən salmaq, üzmək *(sağlamlığı, ağlı, zəkanı və s.);* **a ~ illness** zəiflədən / əldən salan xəstəlik; **a ~ climate** zəiflədən/zəif salan iqlim; *She has been debilitated by dysentery Dizenteriya onu əldən/taqətdən salıb*
**debilitating** [dı.bılı'teıtıŋ] *adj tib.* zəiflədən, zəif salan, taqətdən salan, üzücü; ~ **disease** üzücü xəstəlik
**debilitation** [dı.bılı'teıʃn] *n tib.* zəifləmə, zəiflətmə, zəifləşdirmə; zəiflik, gücsüzlük, taqətsizlik, cansızlıq; arıqlama, üzülmə, əldən düşmə
**debility** [dı'bılıtı] *n* zəiflik; gücsüzlük, cansızlıq, taqətsizlik; xəstəlik; üzgünlük, naxoşluq, qüvvətsizlik; **high fever and general ~** yüksək qızdırma və ümumi zəiflik / taqətsizlik
**debit**[1] ['debıt] *n müh.* 1. debit *(gəlir-çıxar dəftərində çatacaq məbləğlərin yazıldığı sol tərəf);* **~ and credit** gəlir və çıxar; **to put /to place to** *smb.'s* **~** bir kəsin debitinə yazmaq; 2. hesabın sol tərəfi *(debet yazılan yer)*
**debit**[2] ['debıt] *v müh.* 1. debitə yazmaq/daxil etmək; **to ~ a sum against/to** *smb.'s* **account** bir kəsin debitinə müəyyən məbləğ daxil etmək; 2. cari hesabdan almaq; **to ~** *smb.* **with five pounds** bir kəsdən beş funt almaq; *The money will be debited from your account Pul sənin / sizin hesabından / hesabınızdan alınacaq*
**debonair** [.debə'neəʳ] *adj* 1. rəhmli, yumşaqürəkli; həlim, mehriban; sevincli, şad, şən; güləruzlü, həmişə şən/şad; 2. ədəbli, nəzakətli, mərifətli *(davranış haq.)*
**debrief** [dı:'brı:f] *v* 1. uçuş tapşırığını yerinə yetirdikdən sonra sorğu-sual aparmaq *(təyyarəçi ilə, kosmonavtla və s.);* 2. hesabatı və ya məruzəni dinləmək *(rəsmi dövlət xadimlərinin digər ölkələrə səfərindən sonra)*
**debris** ['debri:] *n fr.* 1. qəlpə, qırıntı, qırıq, parça; *After the crash debris from the plane was spread over a large area Qəzadan sonra təyyarənin qırıqları geniş əraziyə səpələnmişdi/yayılmışdı;* 2. tikinti qırıntıları, tikinti zibili; 3. xarabalıq, viranəlik, xarabazarlıq
**debt** [det] *n* borc; **small ~s** xırda borclar; **national ~** dövlət borcu; **~ of honour** vicdan borcu; **to pay** *one's* **~** borcunu vermək/ödəmək; **to be deep/deeply in ~** çox / çoxlu borcu olmaq; **to be head and ears in ~** boğaza qədər borc içində olmaq, borc içində itib-batmaq; **to be out of ~** borcunu verib qurtarmaq; **to be in** *smb.'s* **~, to be in ~ to** *smb.* bir kəsə borclu olmaq;
◊ **the ~ of nature** ölüm, vəfat; **to pay** *one's* **~ to nature** ölmək, vəfat etmək, dünyasını dəyişmək, rəhmətə getmək
**debtee** [de'tı:] *n* kreditor, kredit/borc verən
**debtless** ['detlıs] *adj* borcsuz, borcu olmayan
**debtor** ['detəʳ] *n müh.* borclu, verəcəkli, debitor; **poor ~** *amer.* borcu verməyə imkanı olmayan *(məhkəmə tərəfindən borc verməkdən azad edilən);* **~ for** *one's* **life to** *smb.* həyatı üçün bir kəsə borclu olma
**debunk** ['dı:'bʌŋk] *v d.d.* 1. ifşa etmək, üstünü açmaq, aşkara çıxartmaq *(yalanı);* 2. hörmətdən/etibardan/gözdən salmaq
**debunking** ['dı:'bʌŋkıŋ] *n d.d.* 1. ifşa etmə, üstünü açma *(yalanın və s.);* 2. hörmətdən / etibardan / gözdən salma
**debut**[1] ['deıbu:] *n fr.* debüt *(səhnəyə ilk çıxış, şahmat oynayanda başlanğıc);* **to make** *one's* **~** ilk dəfə çıxış etmək *(səhnədə və s.)*
**debut**[2] ['deıbu:] *v fr.* ilk dəfə çıxış etmək *(səhnədə və s.)*
**debutant** ['debju:ta:ŋ] *n* debütant *(səhnədə və ya şahmat oyununda ilk dəfə çıxış edən adam)*
**debutante** ['debju:ta:nt] *n fr.* debütant qız/ qadın
**decade** ['dekeıd] *n* onillik; dekada; **the first ~ of the 20**[th] **century** 20-ci əsrin birinci onilliyi *(yəni 1901-1910, yaxud 1900-1909-cu illər)*
**decadence** ['dekədəns] *n* 1. tənəzzül; zəifləmə; pisləşmə, xarablaşma; **the ~ of modern society** müasir cəmiyyətin tənəzzülü; 2. dekadentlik *(XIX əsrin axırlarında və XX əsrin əvvəllərində burjua ədəbiyyatında və incəsənətində meydana gəlmiş mürtəce cərəyan)*
**decadency** ['dekədənsı] *n* tənəzzül; çürümə; pozğunluq
**decadent**[1] ['dekədənt] *n* dekadent; dekadentlik nümayəndəsi
**decadent**[2] ['dekədənt] *adj* xarab olmuş, qeyri-sağlam; çürüyən; **a ~ society** çürüyən cəmiyyət
**decamp** [dı'kæmp] *v* gizlənmək, qaçıb gizlənmək; yox olmaq, yoxa çıxmaq, gözdən itmək; qaçmaq, əkilmək; *The criminal had decamped Cinayətkar qaçıb gizləndi; She had decamped with all our money O, bizim pulumuzun hamısını götürüb əkildi / qaçdı*
**decampment** [dı'kæmpmənt] *n* qaçma; qaçaqaç; sürətlə geri çəkilmə / qaçma
**decangular** [de'kæŋgjulə] *n riyaz.* onbucaqlı
**decant** [dı'kænt] *v* süzmək, süzüb ayırmaq, süzüb

təmizləmək *(südü, şərabı və s.)*, süzgəcdən keçirmək
**decantation** [ˌdi:kæn'teɪʃn] *n* süzmə, süzüb təmizləmə / ayırma, süzgəcdən keçirmə
**decanter** [dɪ'kæntəʳ] *n* **1.** qrafin; **2.** durulducu qab / çən / hovuz
**decapitate** [dɪ'kæpɪteɪt] *v* **1.** başını kəsmək / vurmaq; **2.** *amer. d.d.* dövlət müəssisələrinin başçısını dəyişmək *(süs. seçkidə qalib gəldikdən sonra)*
**decapitation** [dɪˌkæpɪ'teɪʃn] *n* **1.** başını kəsmə; **2.** rəhbərliyi dəyişdirmə
**decathlete** [dɪ'kæθli:t] *n* onnövçü
**decathlon** [dɪ'kæθlən] *n id.* onnövçülük
**decathlonist** [dɪ'kæθlənɪst] *n* = **decathlete**
**decay**[1] [dɪ'keɪ] *n* **1.** çürümə, iylənmə, qoxuma; **moral** ~ mənəvi çürümə; **2.** solma, saralıb solma; **the ~ of leaves** yarpaqların solması/saralıb solması; **3.** dağılma, korlanma, pozulma, uçma, uçub dağılma; **the ~ of family** ailənin dağılması; **the ~ of a building** binanın uçub dağılması; **to fall into ~** dağılmaq; uçub dağılmaq / yerlə yeksan olmaq, məhv olmaq; *The feudal system slowly fell into decay Feodalizm sistemi yavaş-yavaş dağıldı;* **4.** xarab olma, köhnəlmə; **the ~ of health** sağlamlığın pozulması; **to be in ~** dağıdılmaq, xarab edilmək, sökülüb dağıdılmaq
**decay**[2] [dɪ'keɪ] *v* **1.** çürümək; pozulmaq *(mənəvi cəhətdən)*, pozmaq, mənəviyyatını /əxlaqını pozmaq; xarab olmaq/etmək *(həm də diş haq.)*; *Sugar decays your teeth Şəkər sənin/sizin dişlərini/dişlərinizi xarab edəcək/çürüdəcək;* **2.** köhnəlmək, dağılmaq *(bina haq.)*; **3.** solmaq, soluxmaq, solub saralmaq *(bitki haq.)*; **4.** zəifləmək, sınıxmaq, arıqlamaq, sısqalaşmaq, yox olmaq, yox olub getmək; dağılmaq, tamamilə dağılmaq *(dövlət haq.)*; pozmaq *(səhhət haq.)*; korlamaq, zay etmək *(gözəlliyi)*; **5.** ruhdan düşmək *(insan haq.)*
**decayed** [dɪ'keɪd] *adj* **1.** korlanmış, çürümüş, xarab olmuş; ~ **tooth** çürümüş / xarab olmuş diş; **2.** solmuş, soluxmuş; ~ **vegetables** soluxmuş tərəvəzlər; **3.** pozulmuş, dağılmış; ~ **family** dağılmış ailə
**decaying** [dɪ'keɪɪŋ] *adj* **1.** çürüyən, xarab olan, köhnələn; ~ **tooth** *tib.* çürüyən diş; ~ **buildings** uçub dağılan binalar; **a ~ society** çürüyən cəmiyyət; **2.** solan, soluxan; ~ **vegetables** soluxan tərəvəzlər
**decease**[1] [dɪ'si:s] *n* ölüm, vəfat etmə
**decease**[2] [dɪ'si:s] *v* ölmək, vəfat etmək
**deceased**[1] [dɪsi:st] *n*: **the ~** ölülər, ölmüşlər, rəhmətliklər
**deceased**[2] [dɪ'si:st] *adj* ölmüş, rəhmətlik; ***one's ~* father / uncle** kiminsə ölmüş atası/dayısı /əmisi; *Both her parents are deceased Onun valideynlərinin hər ikisi ölüb / rəhmətə gedib*
**deceit** [dɪ'si:t] *n* **1.** aldatma, yalan, kələk, fırıldaq; **by ~** aldatma yolu ilə, fırıldaqla, kələklə; **2.** biclik, fənd, hiylə; yalançılıq; **full of ~** yalançı, hiyləgər, məkrli, şeytan
**deceitful** [dɪ'si:tfl] *adj* **1.** yalançı, yalan danışan; **a ~ child** yalançı / yalan danışan uşaq; **2.** xain, xəyanətkar, əhdi pozan, namərd; yalan; ~ **words** yalan sözlər
**deceitfully** [dɪ'si:tfəlɪ] *adv* yalandan, hiyləgərcəsinə, yalançılıqla, fırıldaqla, hiyləgərliklə, aldadaraq
**deceitfulness** [dɪ'si:tfulnɪs] *n* **1.** aldadıcılıq; saxtalıq, yalançılıq; **2.** ikiüzlülük, riyakarlıq
**deceive** [dɪ'si:v] *v* aldatmaq; **to ~ *smb.*** bir kəsi aldatmaq; *I trust him because I know he would never deceive me Mən ona etibar edirəm, çünki bilirəm ki, o məni heç vaxt aldatmaz; His friendly manner did not deceive us for long Onun dostcasına davranışı bizi uzun müddət aldada bilmədi; He has been deceiving his wife for months O, aylarla arvadını aldadır*
**deceiver** [dɪ'si:vəʳ] *n* yalançı, fırıldaqçı, hiyləgər, adamaldadan, dələduz
**decelerate** [ˌdi:'seləreɪt] *v* sürəti azaltmaq / aşağı salmaq
**deceleration** ['di:ˌselə'reɪʃn] *n* **1.** surətin / dövrəmənin sayı/miqdarı, dövrün miqdarı / sayı; **2.** *fiz.* ləngimə, yubanma
**decelerator** [di:'seləreɪtəʳ] *n* **1.** *tex.* reduktor *(dişli çarxlar vasitəsilə hərəkəti bir valdan o birisinə ötürən mexanizm)*; **2.** *kim.* ləngidən *(reaksiyanı)*
**December** [dɪ'sembəʳ] *n* dekabr; **in ~** dekabrda
**Decembrist** [dɪ'sembrɪst] *n tar.* dekabrist
**decency** ['di:snsɪ] *n* **1.** ədəb, tərbiyə, nəzakət; ləyaqət; ~ **in dress** geyimdə təvazökarlıq / abırlılıq; ~ **in conduct** tərbiyəli / nəzakətli davranış; **in common ~** ədəbə / nəzakətə hörmət; **breach of ~, offence against ~** ədəb qaydalarını pozma; **to have no idea of ~** tərbiyədən/nəzakətdən əsla xəbəri olmamaq; əsla utanmamaq; **2.** mərifət; təmizlik, düzlük, alicənablıq, vicdanlılıq
**decent** ['di:snt] *adj* **1.** ədəbli, tərbiyəli, nəzakətli; layiqli, ləyaqətli; vicdanlı, abırlı, nəcib, alicənab, əxlaqlı; çox yaxşı; ~ **conduct** əxlaqlı/ədəbli/nəzakətli/nəcib davranış; ~ **people** ədəbli/tərbiyəli/ləyaqətli/vicdanlı/nəcib adamlar; *I tell you decent people just don't do things like that Mən sənə/sizə sadəcə olaraq deyirəm ki, ləyaqətli/vicdanlı adamlar belə iş görmürlər;* ~ **conditions** çox yaxşı şərait; **a ~ suit of clothes** layiqli/abırlı paltar; *Those tight trousers of yours aren't very decent Sənin /Sizin o dar şalvarın/şalvarınız çox da abırlı/layiqli deyil;* **to look ~** ədəbli/tərbiyəli görünmək; **2.** əməlli-başlı, çox yaxşı, ürəyin istəyən; *You can get quite a decent meal there without spending too much money Sən/Siz çox pul xərcləmədən orada əməlli-başlı / ürəyin/ürəyiniz istəyən kimi xörək*



*yeyə bilərsən/bilərsiniz;* **3.** çoxlu, xeyli; lazımi /kifayət qədər; ~ **fortune** lazımi / kifayət qədər var-dövlət; **4.** layiq, yaraşan; ~ **for a king** krala layiq / yaraşan
**decently** ['di:sntlɪ] *adv* **1.** tərbiyəli, layiqli, ləyaqətlə; ədəblə, ədəbli, vicdanla, hörmətlə, olduqca yaxşı; təvazökarlıqla, sadə, adi; **to dress ~** abırlı/ədəbli geyinmək; ~ **dressed** abırlı / ədəbli geyinmiş; **2.** yaxşı, çox yaxşı, yaraşan, münasib, əlverişli; **to speak ~** yaxşı danışmaq; **to speak ~ about *smb.*** bir kəs haqqında yaxşı danışmaq; **to treat *smb.* ~** bir kəsə yaxşı münasibət göstərmək, bir kəslə yaxşı davranmaq
**decentralization** [di:ˌsentrəlaɪ'zeɪʃn] *n* desentralizasiya *(mərkəzi orqanların bəzi vəzifələrinin yerli orqanlara verilməsi)*
**decentralize** [dɪ:'sentrəlaɪz] *v* desentralizasiya etmək *(mərkəzi orqanların bəzi vəzifələrini yerli orqanlara vermək)*
**deception** [dɪ'sepʃn] *n* **1.** yalan, aldatma, hiylə, kələk, fırıldaq; kələkbazlıq, fırıldaqçılıq; **to practise ~** aldatmaq, fırıldaqçılıqla məşğul olmaq; **to practise ~ on the public** xalqı / ictimaiyyəti aldatmaq; **to fall into ~** yalanın qurbanı olmaq; aldadılmaq; *Public deception was complete Hamını aldatmışdılar, Hamı aldanmışdı;* **2.** aldanma, illüziya, xəyal, xülya, göz aldanması; *This is a pure deception Bu, tam xəyaldır/xülyadır / illüziyadır;* **3.** fırıldaq, yalan; **clever ~** ağıllı kələk / fırıldaq; **to obtain *smth.* by ~** bir şeyi kələklə / fırıldaqla əldə etmək; *It was an innocent deception, meant as a joke Bu, zarafatyana deyilmiş bir zərərsiz yalan idi*
**deceptive** [dɪ'septɪv] *adj* aldadıcı; yalançı, saxta; çaşdırıcı; ~ **weather** aldadıcı hava; ~ **quiet** aldadıcı / çaşdırıcı sakitlik; *Appearances are often deceptive Xarici görünüş çox vaxt aldadıcı olur*
**deceptively** [dɪ'septɪvlɪ] *adv* saxta/yalan bir tərzdə, aldadıcı şəkildə; *The tank is deceptively small; it actually holds quite a lot Çən aldadıcı şəkildə balacadır; əslində o çox tutur*
**deceptiveness** [dɪ'septɪvnɪs] *n* aldadıcılıq; saxtalıq, yalançılıq
**decide** [dɪ'saɪd] *v* **1.** qərara almaq/gəlmək, qərar qəbul etmək, qərarlaşdırmaq; qərar vermək; **2.** həll etmək, cavabını tapmaq *(məsələnin)*; **to ~ a question** məsələ həll etmək; **to ~ a matter / a case in *smb.'s* favour** məsələni bir kəsin xeyrinə həll etmək; **to ~ against *smth.*** məsələni həll etməkdən boyun qaçırmaq, məsələni həll etməmək; **to ~ against doing *smth.*** bir işi görməmək qərarına gəlmək; *He decided against going there O ora getməmək qərarına gəldi;* **to ~ against / in favour of plaintiff** məsələni iddiaçının xeyrinə həll etməmək / xeyrinə həll etmək; **to ~ what to do next** sonra nə etmək haqqında qərar qəbul etmək/qərara gəlmək; **to ~ by toss** püşk atmaqla həll etmək; *This day will decide her fate Onun taleyi bu gün həll ediləcək;* **3.** müəyyən qərara gəlmək/qərar vermək; seçmək; **to ~ between two alternatives** ikisindən birini seçmək; *She decided the black coat O, qara paltonu seçdi; She decided not to go alone O, qərara gəldi ki, tək getməsin; It's for you to decide İndi seçim səníndir / sizindir, İndi söz səníndir / sizindir; He decided to go, He decided on / for going O, getmək qərarına gəldi, O, getmək haqqında qərar qəbul etdi;* **4.** şübhələrə son qoymaq, qərar qəbul etməyə təhrik / sövq etmək; *That decided me O məni qərar qəbul etməyə sövq etdi*
**decided** [dɪ'saɪdɪd] *adj* **1.** müəyyən, qəti; şəksiz, şübhəsiz; həll edilmiş, qərara alınmış; ~ **opinion** müəyyən / qəti fikir; **to give a ~ answer** qəti cavab vermək; **2.** cəsarətli, əzmli, səbatlı, qərarından dönməyən; tərəddüd etməyən; **a person of ~ views** qətiyyətli/əzmli adam; **to speak in a ~ voice** əzmlə/qətiyyətlə danışmaq; *I'm quite decided Mən öz fikrimdən qətiyyən dönən deyiləm; She turned home with decided steps O, qətiyyətli addımlarla evə döndü;* **3.** mübahisəsiz, şübhəsiz, şübhə doğurmayan; açıq-aydın; ~ **success** şübhəsiz/şübhə doğurmayan müvəffəqiyyət; ~ **difference** açıq-aydın fərq; ~ **superiority** açıq-aydın / şübhəsiz üstünlük
**decidedly** [dɪ'saɪdɪdlɪ] *adv* **1.** inamla, əzmlə; qətiyyətlə; **to speak ~** qətiyyətlə/əzmlə/ inamla danışmaq; **to answer ~** inamla/qətiyyətlə /əzmlə cavab vermək; **2.** şübhəsiz, açıq-aydın, həqiqətən; *I feel decidedly unwell this morning Mən həqiqətən bu səhər özümü pis hiss edirəm; She is a decidedly pretty girl O həqiqətən qəşəng qızdır; The child is decidedly better today Uşaq həqiqətən bu gün daha yaxşıdır*
**deciduous** [dɪ'sɪdjuəs] *adj* **1.** dəyişilən *(buynuz haq.)*; süd *(diş haq.)*; **2.** *bot.* yarpaqlı, yarpağını tökən; ~ **trees** yarpaqlı/yarpağını tökən ağaclar; ~ **forest** yarpaqlı ağac meşəsi
**decigram(me)** ['desɪgræm] *n* desiqram *(qramın onda biri)*
**decilitre** ['desɪˌli:tə] *n* desilitr *(litrin onda biri)*
**decima** ['desɪmə] *n (pl* **-mae***) lat.* onun bir hissəsi
**decimae** ['desɪmi:] *n* **decima** *isminin cəm forması*
**decimal**[1] ['desɪml] *n* onluq kəsr
**decimal**[2] ['desɪml] *adj* onluq; ~ **fraction** onluq kəsr; ~ **point** onluq kəsri tamdan ayıran nöqtə
**decimate** ['desɪmeɪt] *v* **1.** *hərb.* hər on nəfərdən birini güllələmək/qətlə yetirmək; **2.** qırmaq, öldürmək; viran etmək, xaraba qoymaq, dağıtmaq, məhv etmək; **to ~ a country** ölkəni viran etmək/xaraba qoymaq; *Cholera decimated the country Vəba ölkəni viran etdi/xaraba qoydu; Disease has decimated the population Xəstəlik*

*əhalinin onda birini məhv etdi*

**decimation** [ˌdesɪˈmeɪʃn] *n* 1. *hərb.* hər on nəfərdən birini güllələmə/ qətlə yetirmə /öldürmə; 2. viran /xaraba qoyma, qırma, məhv etmə

**decimetre** [ˈdesɪˌmiːtəʳ] *n* desimetr *(metrin onda biri)*

**decipher** [dɪˈsaɪfəʳ] *v* 1. şifrini açmaq; izah/ şərh etmək; 2. araşdırmaq, ayırd/müəyyən etmək, aydınlaşdırmaq; oxumaq; **to ~ an ancient inscription** qədim yazını *(daş, metal, ağac və s. üzərində yazılmış)* oxumaq; *I can't decipher the inscription on the stone Mən daşın üzərindəki yazını oxuya bilmirəm*; **to ~ smb.'s handwriting** bir kəsin xəttini oxuyub başa düşmək; **to ~ a riddle** tapmacanın cavabını tapmaq; 3. başa düşmək, anlamaq; **to ~ an allusion** eyhamı başa düşmək/anlamaq

**decipherable** [dɪˈsaɪfərəbl] *adj* 1. şifrəsini açmaq mümkün olan; 2. oxunaqlı, aydın, asan oxunan *(xətt, yazı haq.)*

**decision** [dɪˈsɪʒn] *n* 1. qərar; **to arrive at/to come to a ~, to make/to take a ~** qərar qəbul etmək /çıxarmaq; *What's your decision? Sənin/Sizin qərarın/qərarınız nədir?*; 2. qətiyyət, qətilik; möhkəmlik; **to lack ~** qətiyyətsiz olmaq; **to show great ~ in** *smth.* bir şeydə qətiyyət göstərmək; **a man of ~** qətiyyətli adam; 3. *id.* xal hesabına qazanılmış qələbə *(yarışlarda)*

**decisive** [dɪˈsaɪsɪv] *adj* 1. qəti, son; inandırıcı, əsaslı; həlledici; mühüm, başlıca; **a ~ victory** qəti/həlledici qələbə; **a ~ battle** həlledici vuruş; **a ~ moment** həlledici an; **a ~ judgement** qəti/son qərar; **a ~ answer** qəti cavab; **~ word** son söz; **~ attack** *hərb.* həlledici hücum; 2. cəsarətli, ürəkli, əzmli; **~ man** cəsarətli /əzmli adam; **~ action** cəsarətli/əzmli hərəkət; *A decisive person acts quickly Cəsarətli adam cəld hərəkət edir;* 3. açıq; açıqdan-açığa, aşkar, açıq-aydın, açıq-aşkar; şübhəsiz; **~ superiority** açıq-aşkar/şübhəsiz üstünlük; **a ~ advantage** açıq-aydın imtiyaz

**decisively** [dɪˈsaɪsɪvlɪ] *adv* 1. qətiyyətlə, qəti, qəti surətdə/olaraq, bütünlüklə, tamamilə; əsaslı olaraq; **to act ~** qətiyyətlə hərəkət etmək; **to speak ~** qətiyyətlə danışmaq; **to answer ~** qətiyyətlə cavab vermək; 2. şübhəsiz; *He is decisively the first of American poets O şübhəsiz amerikan şairləri arasında birincidir*

**decisiveness** [dɪˈsaɪsɪvnɪs] *n* qətilik, cəsarətlilik, əzmlilik; ürəklilik

**deck**[1] [dek] *n* 1. *dən.* göyərtə; **upper ~** yuxarı göyərtə; **middle ~** orta göyərtə; **lower ~** aşağı göyərtə; **under ~(s)** həbsxanada; **on ~** göyərtədə; **to go on ~** göyərtəyə çıxmaq; **to walk the ~** göyərtədə gəzmək; *All hands on deck! dən. Hamı göyərtəyə!* 2. vaqonda/ avtobusda döşəmə; 3. bir dəst oyun kartı;

◊ **to clear the ~s** *dən.* hücuma hazırlaşmaq

**deck**[2] [dek] *v* 1. bəzəmək, bəzəndirmək; **to ~ a room with flowers** otağı çiçəklərlə bəzəmək; **streets ~ed with flags** bayraqlarla bəzədilmiş küçələr; 2. geyindirmək, bəzəndirib-düzəndirmək, geyinib-kecindirmək *(həm də* **to ~ out**); **to ~ oneself** geyinib-kecinmək, bəzənib-düzənmək; *She was decked out in her finest clothes O ən qəşəng paltarını geyinərək bəzənib-düzənmişdi*

**declaim** [dɪˈkleɪm] *v* 1. natiqlik etmək, təmtəraqlı danışmaq, ifadəpərdazlıq/boşboğazlıq/naqqallıq etmək; 2. nitq söyləmək *(verilmiş mövzu üzrə);* 3. *amer.* ifadəli oxumaq *(bədii əsəri);* deklamasiya demək; təmtəraqla söyləmək; **to ~ against** pisləmək, məzəmmət etmək, töhmətləndirmək, qəti etiraz etmək

**declamation** [ˌdekləˈmeɪʃn] *n* 1. deklamasiya, bədii oxu sənəti; 2. təntənəli nitq; 3. verilmiş mövzu üzrə nitq söyləmə; 4. natiqlik sənəti; gözəl və aydın danışma bacarığı/qabiliyyəti; 5. boşboğazlıq, lağlağılıq, naqqallıq; boşboğazlıq/naqqallıq/lağlağılıq etmə; **mere ~** sadəcə olaraq boşboğazlıq/gəvəzəlik/lağlağılıq/naqqallıq; **to burst into a ~ on** *smth.* bir şey haqqında boşboğazlıq/naqqallıq etməyə girişmək

**declamatory** [dɪˈklæmətərɪ] *adj* 1. natiqlik; **her high-flow ~ style** onun təmtəraqlı natiqlik üslubu; 2. təmtəraqlı, təşəxxüslü, ibarəli; calallı, büsatlı, dəbdəbəli, təntənəli; **~ style** dəbdəbəli / təmtəraqlı üslub

**declarant** [dɪˈklerənt] *n hüq.* 1. təqdim edən, verən *(ərizə, məktub və s.)*, ərizəçi, ərizə verən; 2. Amerika vətəndaşlığına qəbul olunmaq üçün ərizə verən əcnəbi

**declaration**[1] [ˌdekləˈreɪʃn] *n* 1. deklarasiya *(sənəd);* **~ of income** gəlir haqqında deklarasiya; 2. bəyannamə; **~ of rights** hüquq bəyannaməsi; **the ~ of Human Rights** İnsan Hüquqları haqqında Bəyannamə; **the ~ of Independence** Müstəqillik haqqında Bəyannamə (1776-cı il); **~ of policy** *dip.* siyasət haqqında bəyannamə; 3. elan; bəyanat; elan etmə; **~ of war** müharibə elan etmə; **~ of the poll** səsvermənin nəticələrini elan etmə; **to make a ~** bəyanat vermək; 4. eşq elan etmə; izhar etmə; **~ of love** eşq elan etmə, məhəbbət izhar etmə; 5. *hüq.* iddia ərizəsi; 6. *hüq.* məhkəmə qərarının əsaslandırma hissəsi; 7. gömrük deklarasiyası

**declaration**[2] [ˌdekləˈreɪʃn] *adj:* **~ day** seçkilərin nəticələrinin elan edildiyi gün

**declarative** [dɪˈklærətɪv] *adj* 1. deklarativ; rəsmi, təntənəli; **~ act** rəsmi / təntənəli hərəkət; **to be ~ of** *smth.* bir şey haqqında rəsmi olaraq danışmaq; 2. *qram.* nəqli; **~ sentence** nəqli cümlə

**declare** [dɪˈkleəʳ] *v* 1. elan / bəyan etmək; bildirmək, məlumat / xəbər vermək; **to ~ peace** sülh elan etmək; **to ~ war** müharibə elan etmək; **to ~ war upon / on a country** bir ölkəyə müharibə elan etmək; **to ~ the result of an election**



seçkinin nəticəsini elan / bəyan etmək; **to ~ one's love** məhəbbətini izhar / elan etmək, 2. saymaq, hesab etmək; etiraf etmək; **to ~ smb. an invalid** bir kəsi əlil hesab etmək; *He was declared an invalid O, əlil hesab edildi; He declares it (to be) a mistake O bunun səhv olduğunu etiraf edir;* 3. kozırını göstərmək *(qumar oyununda);* **to ~ one's hand** 1) kartı açmaq; 2) niyyətini açıb söyləmək; 4. göstərmək, bildirmək; *Nothing declares there was a human being here Burada insan övladının olmasını göstərən heç nə / heç bir şey yoxdur;* 5. **(for, against)** fikir söyləmək, münasibət bildirmək; **to ~ against the King** kralın taxtdan düşməsini tələb etmək; 6. *hüq.* iddia qaldırmaq, iddia ərizəsi vermək; 7. gömrük haqqı verilməli şeyləri təqdim etmək *(gömrükxanada); Have you anything to declare? Gömrük haqqı alınacaq bir şeyiniz varmı?* **to ~ in** səsvermədə iştirak etməyə razılıq vermək; **to ~ off** pozmaq, ləğv etmək *(müqaviləni);* imtina etmək; **to ~ a bargain off** sazişi/razılaşmanı/sövdəni pozmaq; **to ~ oneself** özünü göstərmək/büruzə vermək; əsl simasını göstərmək; *His actions declared him (to be) an honest man Hərəkətləri onun düz / vicdanlı adam olduğunu göstərdi*

**declared** [dɪˈkleəd] *adj* 1. elan edilmiş / olunmuş; bildirilmiş; **~ state of war** müharibə vəziyyətinin rəsmi elan edilməsi; **~ value** *mal.* elan olunmuş dəyər/qiymət; **~ trump** əvvəlcə göstərilmiş kozır; **their ~ and covert objects** onların açıq və gizli məqsədləri; 2. açıq, açıqdan-açığa, aşkar; tanınmış, məşhur; *He's a declared atheist O, açıq ateistdir; Her declared ambition is to become a politician Onun aşkar arzusu / istəyi siyasətçi olmaqdır*

**declassification** [ˌdiːˌklæsɪfɪˈkeɪʃn] *n* məxfilikdən çıxarma; məlum etmə

**declassify** [ˈdiːˈklæsɪfaɪ] *v (pt, pp* **–fied)** məxfilikdən çıxartmaq, qeyri-gizli etmək *(sənədləri, materialları və s.); Plans for nuclear plants have been declassified Nüvə zavodları tikmək planları məxfilikdən çıxarılmışdır*

**declension** [dɪˈklenʃn] *n* 1. meyl; eniş; enmə; **~ towards the sea** yerin dənizə tərəf enməsi; **in the ~ of years** qoca yaşlarında, qocalana yaxın; 2. tənəzzül; **~ of science** elmin tənəzzülü; 3. kənara çıxma, uzaqlaşma, düz gəlməmə *(qəbul edilmiş nümunədən);* dönüklük; 4. *fiz.* meyllənmə *(maqnit əqrəbi haq.);* 5. *qram.* hallanma; **the strong ~** qüvvətli hallanma

**declensional** [dɪˈklenʃnl] *adj qram.* hal, hala aid olan; **~ endings** hal şəkilçiləri

**declinable** [dɪˈklaɪnəbl] *adj qram.* hallanan, hallana bilən, hallara salına bilən

**declination** [ˌdeklɪˈneɪʃn] *n* 1. kənara çıxma, uzaqlaşma; əyilmə; eniş, maillik; **~ of the head** başın əyilməsi; 2. *astr.* meyl, meyllənmə *(ulduzlar haq.);* 3. *fiz.* meyllənmə *(maqnit əqrəbi haq.);* 4. nəzakətli imtina; 5. iflas; korlanma, xarab olma *(mənəviyyat haq.);* əxlaqsızlıq, pozğunluq, əxlaq pozğunluğu; 6. *qram. arx.* hallanma

**decline**[1] [dɪˈklaɪn] *n* 1. süqut, iflas; devrilmə; zəifləmə; azalma; **the ~ of art / of civilization** incəsənətin / mədəniyyətin tənəzzülü; **the ~ of the Roman Empire** Roma imperiyasının süqutu; **the ~ of the Soviet Empire** Sovet imperiyasının süqutu / iflası; 2. pisləşmə, zəifləmə, azalma *(səhhət haq.);* **~ of / in strength** gücün / qüvvənin zəifləməsi; **gradual ~** getdikcə /yavaş-yavaş düşgünləşmə / üzgünləşmə; **the ~ of a fever** istiliyin/qızdırmanın azalması / aşağı düşməsi; *The number of robberies in the area is on the decline Bu ərazidə soyğunçuluq azalır;* 3. son, qürub, ömrün son günləri; **the ~ of the moon** ayın kiçilməsi; **the ~ of day** günün qürubu; **the ~ of life** ömrün qürub çağı / son günləri, qocalıq; 4. üzücü / əldən salan xəstəlik *(xüs. vərəm);* **to die of a ~** vərəmdən ölmək; **to fall into a ~** 1) saralıb solmaq, əriyib qurumaq, əldən düşmək; 2) vərəm xəstəliyinə tutulmaq

**decline**[2] [dɪˈklaɪn] *v* 1. enmək, düşmək; aşağı enmək / düşmək; *The road declines Yol üzüaşağı enir;* 2. əyilmək, baş endirmək/əymək, boyun əymək; 3. batmaq *(günəş haq.); The sun is declining Günəş batır; The day begins to decline Gün axşama dönür;* 4. azalmaq; *His influence declined after he lost the election Seçkini uduzduqdan sonra onun nüfuzu azaldı;* 5. düşmək, kiçilmək; qısalmaq; *The prices began to decline Qiymətlər aşağı düşməyə başladı; The fever has declined Qızdırma / Hərarət düşüb (xəstə haq.);* 6. tənəzzül etmək; durğunlaşmaq; pisləşmək; *The arts declined Sənət tənəzzülə uğradı; Business declined Müəssisədə işlər pisləşdi; His health declined considerably Onun səhhəti nəzərə çarpacaq dərəcədə pisləşdi; His courage began to decline O, cəsarətsizlik göstərməyə başladı;* 7. rədd etmək, qəbul etməmək, imtina etmək, etiraz etmək; **to ~ an offer / an invitation** təklifi / dəvəti rədd etmək; **to ~ a discussion** müzakirədə iştirakdan imtina etmək; **to ~ to answer questions** suallara cavab verməkdən imtina etmək; *I invited her to join us, but she declined my invitation Mən onu bizə qoşulmağa dəvət etdim, lakin o mənim dəvətimi rədd etdi; The minister declined to make a statement Nazir bəyanat verməkdən imtina etdi;* 8. əymək, qaçırmaq; **to ~ one's head on one's breast** başını sinəsinə əymək; 9. *qram.* hallandırmaq

**declining** [dɪˈklaɪnɪŋ] *adj* 1. qoca, qocalıq; **~ years** qocalıq illəri; ömrün qürub çağı; *He spent his declining years in his native country O, qocalıq illərini doğma kəndində keçirdi;* 2. pisləşən, zəifləşən; **~ sales** zəifləyən satış/al-

ver; a ~ **birth-rate** azalan doğum; 3. qurumağa / solmağa başlayan

**decode** [dɪ'koud] *v* şifrəni açmaq; *məc.* oxumaq *(çətin oxunan yazını)*; izah / şərh etmək; başa düşmək; kodunu tapmaq; *We decoded the enemy's telegram and were able to win a famous victory Biz düşmənin teleqramının şifrəsini aça bildik (oxuya bildik) və cahanşümul bir qələbə qazandıq*

**decolletage** [.deɪkɔl'ta:ʒ; deɪ.kɔlə'ta:ʒ] *n fr.* dekolte *(boynu və döşü açıq qadın paltarı)*

**decollete** [deɪ'kɔlteɪ] *adj fr.* dekolteli, dekolte *(boynu, çiyni və döşü açıq)*

**decolonization** [.di:.kɔlənaɪ'zeɪʃən] *n* müstəmləkəçilikdən azad etmə, müstəmləkə ölkəyə azadlıq statusu vermə

**decolonize** [.dɪ'kɔlənaɪz] *v* müstəmləkəçilikdən azad etmək, müstəmləkəyə azadlıq statusu vermək

**decolorate** [di:'kʌləreɪt] *v* rəngsizləşdirmək, rəngini aparmaq, rəngini zəifləmək, solğunlaşdırmaq

**decolouration** [di:.kʌlə'reɪʃn] *n* soldurma, rəngsizləşdirmə, solğunlaşdırma

**decolourize** [di:'kʌləraɪz] *v* rəngini zəifləmək; solğunlaşdırmaq, soldurmaq, rəngini qaçırmaq

**decommission** [.di:kə'mɪʃn] *v* istifadədən çıxarmaq, bağlamaq; **to ~ a nuclear power station** atom elektrik stansiyasını istifadədən çıxarmaq / bağlamaq

**decomposable** [.di:kəm'pouzəbl] *adj* 1. tərkib hissələrinə ayrıla / bölünə bilən; 2. çürüməyə meylli

**decompose** [.di:kəm'pouz] *v* 1. tərkib hissələrinə ayırmaq; **to ~ a force** *fiz.* qüvvələri paylamaq; 2. təhlil etmək; 3. çürümək; *məc.* pozulmaq

**decontaminate** ['di:kən'tæmɪneɪt] *v* deqazasiya etmək, qazdan təmizləmək, zərərsizləşdirmək, zərərsiz hala salmaq, dezinfeksiya etmək; reaktiv maddələrdən təmizləmək

**decontamination** ['di:kən.tæmɪ'neɪʃn] *n* deqazasiya, qazdan təmizləmə, zərərsizləşdirmə, zərərsiz hala salma, reaktiv maddələrdən təmizləmə

**decontrol** ['di:kən'troul] *v* dövlət nəzarətindən çıxarmaq/azad etmək; nəzarəti götürmək

**decor** ['deɪkɔ:ʳ] *n fr.* 1. ornament *(rəssamlıqda, nəqqaşlıqda və s. bəzək)*, bəzək; 2. *teatr.* dekor, dekorasiya *(səhnə bəzəyi)*

**decora** [dɪ'kɔ:rə] *n* **decorum** *sözünün cəm forması*

**decorate** ['dekəreɪt] *n* 1. bəzəmək, zinət vermək, zinətləndirmək; **to ~ a Christmas tree** Yeni il yolkasını bəzəmək; *The streets were decorated with flags Küçələr bayraqlarla bəzədilmişdi;* **to ~ a room with flowers** otağı çiçəklə / güllə bəzəmək; *Those pictures decorate the walls very well O şəkillər divarları çox yaxşı bəzəyir;* 2. rəngləmək, divar kağızı çəkmək, bəzək vurmaq; *We're decorating the kitchen again this summer Biz bu yay mətbəxi yenidən rəngləyəcəyik;* 3. *(adət. məchul növdə)* təltif etmək, nişan / orden vermək; **to ~ *smb.* with an order** bir kəsə orden vermək, bir kəsi ordenlə təltif etmək; *Several soldiers were decorated for bravery Xeyli əsgər igidliyə görə təltif olundu*

**decorated** ['dekəreɪtɪd] *adj* 1. bəzədilmiş, zinətləndirilmiş, bəzək/zinət verilmiş; 2. təltif edilmiş *(orden və ya medalla)*

**decoration** [.dekə'reɪʃn] *n* 1. bəzəmə, bəzək vermə; bədii tərtibat vermə; ~ **of Christmas tree** yeni il yolkasını bəzəmə; 2. bəzək, yaraşıq, bəzək-düzək; 3. orden, medal; mükafat; *There are only a few public occasions on which it is correct to wear all one's decorations Ancaq bir neçə ictimai hadisələr var ki, hər kəsin bütün medal və ordenlərini geyinməsi münasibdir*

**decorative** ['dekərətɪv] *adj* dekorativ; bəzək; ~ **art** dekorativ / tətbiqi sənət; **a ~ gold table** qızıldan hazırlanmış dekorativ stol/bəzək stolu

**decorator** ['dekəreɪtəʳ] *n* 1. dekorator *(dekorasiya rəssamı)*; bəzəkçi, bəzək-düzək verən *(adam)*; 2. rəngsaz; üzçəkən *(mebelə və s.)*, divar kağızı çəkən *(usta)*

**decore** [dɪ'kɔ:] *v arx.* bəzəmək, bəzək/bəzək-düzək vermək

**decorous** ['dekərəs] *adj* ədəbli, tərbiyəli; ləyaqətli, layiqli; olduqca yaxşı; qanacaqlı, mərifətli; ~ **behaviour** ədəbli / layiqli / mərifətli davranış; ~ **speech** ədəbli / ləyaqətli / layiqli nitq

**decorously** ['dekərəslɪ] *adv* ədəblə, ləyaqətlə, qanacaqla, mərifətlə; **to speak** ~ ədəblə / ləyaqətlə / qanacaqla danışmaq

**decorum** [dɪ'kɔ:rəm] *n (pl həm də* **-ra)** 1. zahiri ədəb/ləyaqət; tərbiyəlilik; **to behave with ~** özünü ədəblə/təmkinlə / ləyaqətlə aparmaq; 2. ədəb, ədəb-ərkan, tərbiyə, ədəb qaydaları

**decoy**[1] [dɪ'kɔɪ] *n* 1. tələ, tor, cələ, duzaq; 2. *ovçular tərəfindən ovda heyvanı və ya quşu aldadıb çağırmaq üçün istifadə edilən quş*; 3. tələ yemi

**decoy**[2] [dɪ'kɔɪ] *v* 1. aldatmaq, aldadıb çağırmaq; dadandırmaq; cəlb / cəzb etmək; aldadıb tələyə salmaq; 2. tovlamaq, yoldan çıxarmaq; **to ~ *smb.* to do *smth.*** tovlayıb / biclik işlətməklə bir kəsi bir iş görməyə məcbur etmək

**decrease**[1] ['di:kri:s] *n* azalma, əskilmə; azaltma, əskildirmə, əskiltmə; zəifləmə, zəifləşdirmə, zəifləmə; ~ **of a swelling** şişin azalması; ~ **in population** əhalinin azalması; **to be on the ~** azalmaq, zəifləmək; **some ~ in birth-rate** doğumun bir qədər azalması / əskilməsi; *Certain types of crime seem to be on the decrease Görünür, müəyyən növ cinayətlər azalır / əskilir*

**decrease**[2] [di:'kri:s] *v* 1. azaltmaq; aşağı salmaq; qısaltmaq, gödəltmək; 2. aşağı düşmək; azalmaq, yığılmaq, bürüşmək; *Temperature decreases Temperatur aşağı düşür; His influence slowly decreases Onun nüfuzu yavaş-yavaş azalır / aşağı düşür; Student numbers have decreased by 500 Tələbələrin sayı 500 nəfər azalıb; Interest in the sport is steadily decreasing İdmana maraq durmadan azalır*

**decree**[1] [dɪ'kri:] *n* 1. fərman; dekret *(ali hökumət orqanlarının qərarı)*, əmr, hökm, sərəncam; qanun; **to issue a ~** fərman / sərəncam /əmr vermək; **to establish by ~** qanunla təsis / müəyyən/təyin etmək; ~ **of nature** təbiətin hökmü; 2. *hüq.* hökm, qərar *(məhkəmənin)*; **to pronounce a ~** hökm çıxartmaq; 3. *din.* kilsə şurasının qərarı; **the ~s of fate** taleyin hökmü

**decree**[2] [dɪ'kri:] *v* 1. fərman/əmr/dekret vermək; **to ~ *smth.*** bir şeyi qərara almaq; *The governor decreed a day of mourning Qubernator matəm günü haqqında fərman verdi*; 2. *arx.* müəyyənləşdirmək, həll etmək; *Fate decreed that they would not meet again Taleyin əmri ilə onlar bir daha görüşmədilər*; 3. məhkəmə hökmü çıxarmaq

**decrepit** [dɪ'krepɪt] *adj* zəif, gücsüz, taqətsiz; qocalıb əldən düşmüş, qoca; ~ **horse** qoca / qocalıb əldən düşmüş at; **a ~ person** qoca /gücsüz/qocalıb əldən düşmüş adam; **a ~ bicycle** köhnə / köhnəlmiş velosiped

**decry** [dɪ'kraɪ] *v* 1. açıq/açıq-açığına ittiham etmək/qınamaq/pisləmək, məzəmmət etmək, danlamaq; 2. qiymətdən salmaq *(xüs. xarici valyutanı)*

**decuman** ['dekjumən] *adj* nəhəng, çox iri /böyük; ~ **wave** nəhəng/ çox böyük dalğa

**dedicate** ['dedɪkeɪt] *v* 1. həsr / sərf etmək; **to ~ *one's* life to work** həyatını işə sərf etmək; **to ~ *one's* life to *one's* children** həyatını (öz) uşaqlarına həsr etmək; **to ~ *one's* time to pleasure** vaxtını əylənməyə /eyş-işrətə sərf etmək; **to ~ *one's* book to *one's* friend** kitabını dostuna həsr etmək; *He dedicated his first book to his mother O, özünün birinci kitabını anasına həsr etdi;* 2. *amer. d.d.* açmaq, açıq elan etmək *(təntənəli surətdə)*; **to ~ a world fair** dünya yarmarkasını açmaq / açıq elan etmək; 3. əziz tutmaq, təqdir etmək, müqəddəs saymaq *(kilsəni və s.)*

**dedication** [.dedɪ'keɪʃn] *n* 1. həsr etmə / edilmə; ithaf etmə/edilmə; *I admire your dedication to your work Mən sənin / sizin özünü/özünüzü öz işinə/işinizə həsr etməyinə / etməyinizə vurğunam*; 2. yazı, ithaf *(kitabda)*; 3. əziz tutma, təqdis etmə, müqəddəs sayma *(kilsəni və s.)*

**dedicator** ['dedɪkeɪtəʳ] *n* kitabını ithaf edən müəllif *(bir kəsə)*

**deduce** [dɪ'dju:s] *v* nəticə çıxarmaq, nəticəyə gəlmək; *If a=b and b=c, we can deduce that a=c Əgər a=b və b=c desək, biz belə nəticəyə gələ bilərik ki, a=c; It would be unwise to deduce from these figures that the economy is recovering Bu rəqəmlərdən iqtisadiyyatın qaydaya düşməsi nəticəsinə gəlmək ağılsızlıq olardı*

**deduct** [dɪ'dʌkt] *v* 1. tutmaq, çıxmaq *(verilən puldan)*; **to ~ a sum from *smb.*'s pay** bir kəsin maaşından müəyyən məbləğ tutmaq/çıxmaq; *Tax is deducted from your salary Vergi sənin/sizin əmək haqqından / haqqınızdan çıxılır / tutulur;* **to ~ the cost of the transportation** nəqliyyat xərclərini çıxmaq; **to ~ 5% from / out of *smb.*'s pay** bir kəsin maaşından 5% tutmaq; 2. *riyaz.* çıxmaq *(bir ədədi o birindən)*

**deduction** [dɪ'dʌkʃn] *n* 1. çıxma, tutma; ~ **of a sum from *smb.*'s pay** bir kəsin maaşından çıxma / tutma; **to make ~** tutmaq, çıxmaq; ~ **from pay for insurance and pension** sığorta və təqaüd üçün əmək haqqından tutulan *(pul)*; 2. *riyaz.* çıxılan; 3. güzəşt; güzəştə getmə; **a ~ in the yearly rent** illik rentada güzəştə getmə; 4. nəticə, əqli nəticə; əqli nəticəyə gəlmə; deduksiya *(idrak prosesində ümumidən xüsusiyə getmə)*; **to draw a ~** məntiqi nəticə çıxarmaq; **to reach an opinion through / by ~** deduksiya yolu ilə məntiqi nəticəyə gəlmək

**deductive** [dɪ'dʌktɪv] *adj* deduktiv; ~ **method** deduktiv metod; ~ **reasoning** deduktiv mühakimə, mühakimənin ümumidən xüsusiyə doğru getməsi

**deductively** [dɪ'dʌktɪvlɪ] *adv* deduktiv yolla, deduksiya vasitəsilə

**deed** [di:d] *n* 1. əməl, rəftar, iş, hərəkət; **good/evil ~** yaxşı/pis əməl; **a ~ of horror** dəhşətli əməl / hərəkət; *Their deeds do not agree with their words Onların əməlləri sözlərilə uzlaşmır / uyğun gəlmir;* **to serve *smb.* in ~ and word** bir kəsə əməllə və sözlə xidmət etmək; **to be rewarded for *one's* good ~s** yaxşı əməllərinə görə mükafatlandırılmaq; *Deeds are better than words when people need help Adamların köməyə ehtiyacı olduqda, sözdən çox, hərəkət etmək daha yaxşıdır;* 2. həqiqət, fakt; **in very ~** həqiqətdə, doğrusu; 3. qocalıq, igidlik, rəşadət; hünər; fədakarlıq; **the ~s of a hero** qəhrəmanın igidliyi / hünəri / rəşadəti; 4. *hüq.* iş, möhürlənmiş sənəd; akt; **title ~** hüququ təsdiq/müəyyən edən sənəd; **to draw up a ~** sənəd tərtib etmək

**deedful** ['dɪ:dful] *adj* fəal, işgüzar, işcil, çalışqan

**deedless** ['di:dlɪs] *adj* fəaliyyətsiz, hərəkətsiz, qeyri-fəal, passiv

**deem** [di:m] *v* güman / zənn / fərz / hesab etmək, sanmaq; fikirləşmək; **to ~ well / highly of *smth.*** bir şey haqqında yüksək fikirdə olmaq; **to ~ a proposal good** təklifi yaxşı hesab etmək; **to ~ it wise to do *smth.*** bir işi görməyi vacib hesab etmək; **to ~ it *one's* duty to do *smth.*** bir işi görməyi öz borcu hesab etmək; *I deem it fair Mən bunu ədalətli hesab edirəm; She was deemed (to*

*be) the winner O, qalib hesab edildi*

**deep¹** [di:p] *n* 1. dərinlik; **the ~ of knowledge** biliyin dərinliyi; 2. dərin yer, çala, çökək; çuxur; batıq; **The Boston ~** Boston çuxuru; 3. *(the ~) şair.* dəniz, okean, dərya; **the azure ~** mavi okean

**deep²** [di:p] *adj* **(-er, -est)** 1. dərin; **~ river /snow /wound / well** dərin çay/ qar/ yara /quyu; **~ sleep** dərin yuxu; **a ~ breath** dərin nəfəs; **to take a ~ breath** dərin nəfəs almaq; **a ~ influence** dərin təsir; **as ~ as a well** quyu kimi dərin; 2. müəyyən dərinliyi olan, müəyyən dərinliyə malik olan; **a house ~ in the valley** dərənin dərinliyində ev; 3. dalmış, getmiş *(fikrə)*; **~ in thought** dərin fikrə dalmış / getmiş; **~ in debt** borc içində itib-batmış; **~ in difficulties** çətinlik içində batıb qalmış; 4. tünd *(rəng haq.)*; **~ blue** tünd-mavi, tünd- göy; *The sky was deep blue Səma tünd mavi rəngdə idi;* 5. çətin, anlaşılması çətin olan; **a ~ person** çətin adam; **~ scientific principles** anlaşılması çətin elmi prinsiplər; 6. ciddi; əsaslı; fundamental; **~ thinker** ciddi mütəfəkkir; **~ study** fundamental tədqiqat; **~ argument** ciddi arqument / dəlil; **~ problem** ciddi problem; 7. mürəkkəb, dərkedilməz; çətin; **~ secret** dərkedilməz sirr; **~ game** çətin /mürəkkəb oyun; 8. qatı, bərk, yaman; **~ enemy** qatı / qəddar düşmən; **~ colour** qatı rəng;

◊ **~ pocket** dövlət, var-dövlət, varlılıq; **to be in ~ waters** çətin vəziyyətdə olmaq; **to get into ~ waters** çətin vəziyyətə düşmək; **to go off the ~ end** həyəcana gəlmək, coşmaq, qızışmaq, cuşa gəlmək

**deep³** [di:p] *adv* **(-er, -est)** dərin; **to dig ~** dərin qazmaq; *We had to dig deeper to find water Su tapmaq üçün biz daha dərin qazmalı olduq;*

◊ *Still waters run deep at. söz.* ≅ *Suyun lal axanı, adamın yerə baxanı*

**deep-browed** ['di:p'braud] *adj* çox ağıllı, zəkalı; *d.d.* ağıl dəryası

**deep-brown** ['di:p'braun] *adj* tünd-palıdı, tünd-şabalıdı, tünd-qəhvəyi

**deepen** ['di:pn] *v* 1. dərinləşdirmək; dərin etmək; **to ~ a channel** kanalı dərinləşdirmək; *We'll have to deepen the well if we want more water Əgər biz çox su istəyiriksə, quyunu dərinləşdirməli olacağıq;* 2. dərinləşmək; daha dərin olmaq; *The lake deepened after the dam was built Bənd tikildikdən sonra göl dərinləşdi;* 3. *məc.* dərinləşdirmək; **to ~ one's knowledge** biliyini dərinləşdirmək; 4. qatılaşdırmaq, tündləşmək *(rəngi, boyanı)*; *The darkness deepens Qaranlıq qatılaşır; The colour deepens by exposure to the air Havada rəng/ boya tündləşir*

**deepfreeze¹** ['di:pfri:z] *n* dondurucu kamera *(soyuducu cihazda)*

**deepfreeze²** ['di:pfri:z] *v* dondurmaq, bərk dondurmaq; **to ~ fish** balığı bərk dondurmaq

**deep-green** ['di:p'gri:n] *adj* tünd-yaşıl

**deeply** [di:plı] *adv* 1. dərin; **to dig ~** dərin qazmaq; **to feel ~** dərin həyəcan keçirmək; 2. bərk, çox; **to drink ~** bərk / çox içmək; 3. dərindən, hərtərəfli; **to consider the subject ~** məsələni hərtərəfli / dərindən götür-qoy etmək; **~ interested** dərindən maraqlanan; **~ impressed** dərindən mütəəssirlənən; 4. çox, çox bərk; **~ offended** bərk/çox bərk incimiş; **~ indebted** çox borca düşmüş, borc içində boğulan; *She felt her mother's death deeply O, anasının ölümündən sarsıldı;* 5. alçaq səslə / tonla

**deepness** ['di:pnıs] *n* dərinlik

**deep-read** ['di:p'red] *n* çox oxumuş; məlumatlı, bilikli

**deep-rooted** ['di:p'ru:tıd] *adj* dərin kök salmış, dərin kökü olan, kök salmış/bağlamış; islahedilməz; **~ habits** islahedilməz vərdişlər; **~ hatred** dərin kök salmış/ nifrət; **~ traditions** dərin kök salmış adətlər

**deep-seated** ['di:p'si:tıd] *adj* = **deep-rooted**

**deer** [dıə<sup>r</sup>] *n (cəmdə dəyişmir)* 1. *zool.* maral; 2. qırmızımtıl qəhvəyi rəng;

◊ **to run like a ~** ceyran kimi qaçmaq

**deer-forest** ['dıə.fɔrıst] *n* maral qoruğu, marallar üçün qoruq yeri

**deer-hair** ['dıəheə<sup>r</sup>] *n* 1. maral yunu; 2. *bot.* simli qamış

**deer-hound** ['dıəhaund] *n* şotlandiya tazısı /ov iti *(it növü)*

**deer-neck** ['dıənek] *n* nazik boğaz *(atlarda)*

**deer-park** ['dıəpa:k] *n* = **deer-forest**

**deer's eye** ['dıəzaı] *n* şabalıd

**deerskin** ['dıəskın] *n* maral dərisi; sığın dərisi

**deer-stalker** ['dıə.stɔ:kə<sup>r</sup>] *n* 1. qiymətli dərisi olan heyvan ovçusu; 2. ovçu papağı *(keçədən tikilmiş)*

**deer-stalking** ['dıə.stɔ:kıŋ] *n* maral ovu

**deer-stealer** ['dıə.sti:lə<sup>r</sup>] *n* maral öldürən və ya oğurlayan brakonyer *(icazəsiz maral ovlayan adam)*

**deer-tiger** ['dıə.taıgə<sup>r</sup>] *n zool.* puma, kuquar *(Amerikada yaşayan vəhşi pişik)*

**deface** [dı'feıs] *v* 1. korlamaq, xarab etmək, pis vəziyyətə salmaq, eybəcər hala salmaq; təhrif etmək; **to ~ a work of art** incəsənət əsərini korlamaq/xarab etmək; *The wall had been defaced with slogans Şüarlar divarı pis vəziyyətə salmışdı;* 2. pozmaq, oxunmaz hala salmaq; *It is an offence to deface library books Kitabxana kitablarını pozmaq/oxunmaz hala salmaq qəbahətdir / yaramaz hərəkətdir*

**defacement** [dı'feısmənt] *n* 1. korlama, korlanma; xarab etmə / edilmə, xarab olma; təhrif etmə/edilmə; 2. pozma, qaralama, pozulma, qaralanma; 3. eybəcərlik, kifirlik, çirkinlik

**de facto¹** [.di:'fæktou] *adj* de-fakto, faktiki, həqiqi; **a ruler/government ~** hakimiyyətdə olan hökmdar / hökumət

**de facto²** [.di:'fæktou] *adv* de-fakto, faktik surətdə, işdə, həqiqətdə; *Though his kingship was challenged, he continued to rule de facto Onun krallığının rədd edilməsinə baxmayaraq, o həqiqətdə/de-fakto/ faktiki olaraq rəhbərliyini davam etdirirdi*



**defamation** [.defə'meıʃn] *n* diffamasiya *(bir şəxsi ləkələyən məlumatın mətbuatda çap edilməsi)*; söyüş, söymə; böhtan, iftira, şər; **~ of character** şəxsin hörmətdən/etibardan/nüfuzdan salınması

**defamatory** [dı'fæmətərı] *adj* hörmətdən/etibardan /nüfuzdan salan; böhtançı, biabır edici; **a ~ statement** ifşaedici/böhtançı bəyanat; **a ~ book** biabırçı kitab

**defame** [dı'feım] *v* abrını tökmək, söyüb biabır etmək, bədnam etmək, ləkələmək; rüsvay etmək

**defatted** [dı:'fætıd] *adj* yağsızlaşdırılmış, yağı alınmış

**default¹** [dı'fɔ:lt] *n* 1. təəhhüdü yerinə yetirməmə, təəhhüdün yerinə yetirilməməsi *(xüs. pulla əlaqədar olan)*; ödəməmə, ödəniləcək pulu vaxtında ödəməmə; borcu verməkdən imtina etmə; 2. diqqətsizlik, gözdən qaçırma; səhlənkarlıq, başısoyuqluq; **through smb.'s ~** bir kəsin səhlənkarlığı/başısoyuqluğu/diqqətsizliyi üzündən; 3. *hüq.* məhkəməyə gəlməmə; **to make ~** məhkəmənin çağırışına gəlməmək; **to suffer a ~** məhkəməyə gəlməmək üzündən işi uduzmaq; **to go by ~** cavabdeh olmadan işə baxmaq; 4. *id.* yarışdan çıxma; **to lose a match by ~** yarışa gəlməməyə görə sıfır xal almaq; *They lost the match by default Gəlmədiklərinə görə onlara məğlubiyyət verdilər;* 5. *ovç.* izi itirmə

**default²** [dı'fɔ:lt] *v* 1. öhdəliyini/təəhhüdünü yerinə yetirməmək *(xüs. pula aid)*; pozmaq *(müqaviləni)*; yerinə yetirməmək *(vədi)*; divident *(qazanc payı)* verməyi dayandırmaq; 2. *hüq.* məhkəmənin çağırışına gəlməkdən boyun qaçırmaq; 3. *hüq.* məhkəməyə gəlməkdən boyun qaçırmanı qeydə almaq; işə qiyabi baxmaq, qiyabi qərar çıxarmaq *(iddiaçının xeyrinə)*; 4. *id.* yarışdan çıxmaq, mübarizəni dayandırmaq

**defaulter** [dı'fɔ:ltə<sup>r</sup>] *n* 1. öhdəliyi/təəhhüdü yerinə yetirməyən tərəf; 2. bankrot, müflis, var-yoxu əlindən çıxan *(adam)*; 3. israfçı; 4. *hüq.* məhkəməyə gəlməkdən boyun qaçıran tərəf; 5. qaydanı/qayda-qanunu pozan/günahı olan əsgər; 6. *id.* yarışdan çıxan idmançı *(yarış qurtarmamış)*

**defeat¹** [dı'fi:t] *n* 1. məğlubiyyət, məğlub olma; darmadağın etmə / edilmə; tar-mar etmə / edilmə; tar-mar; **the ~ of a party** partiyanın məğlubiyyəti *(seçkidə və s.)*; **the ~ on points** *id.* xal hesabı ilə məğlubiyyət / məğlub olma; *I never consider the possibility of defeat Mən heç vaxt məğlubiyyətin mümkünlüyünü təsəvvür etmirəm*; **to inflict / to administer a ~ upon smb.** bir kəsi məğlubiyyətə düçar etmək / uğratmaq; **to suffer / to sustain a ~** məğlubiyyətə düçar olmaq / uğramaq; *We had six wins and two defeats this season Bu mövsümdə bizim altı qələbəmiz və iki məğlubiyyətimiz olub;* 2. puça / boşa çıxma *(ümid haq.)*; *It was the defeat of all my hopes Bu mənim bütün ümidlərimin puça / boşa çıxması idi;* 3. *hüq.* ləğv etmə

**defeat²** [dı'fi:t] *v* 1. məğlub etmək, məğlubiyyətə düçar etmək/uğratmaq; **to ~ the enemy** düşməni məğlub etmək/məğlubiyyətə uğratmaq; *The enemy was defeated in a decisive battle Düşmən həlledici döyüşdə məğlub edildi;* **to ~ a candidate** namizədi məğlub etmək *(seçkidə)*; *We will defeat the government at the next election Biz gələn seçkidə hökuməti məğlub edəcəyik*; **to ~ smb. on points** *id.* bir kəsi xal hesabı ilə məğlub etmək; *Our team has defeated their opponents on points Bizim komanda rəqiblərini xal hesabı ilə məğlub edib*; 2. puça/boşa çıxartmaq, pozmaq, müvəffəqiyyətsizliyə uğratmaq *(işi və s.)*; **to ~ smb. of his hopes** *arx.* bir kəsin ümidlərini boşa çıxartmaq / puç etmək; 3. *hüq.* ləğv etmək

**defeatism** [dı'fi:tızm] *n* məğlubiyyətçilik

**defecate** ['defıkeıt] *v* 1. təmizləmək; çökdürmək, çökməyə qoymaq *(mayeni)*; təmizlənmək, çökmək *(maye)*; 2. *fiziol.* nəcis ifraz etmək, qarnını boşaltmaq

**defecation** [.defı'keıʃn] *n* 1. təmizləmə, təmizlənmə; boşaltma; saflaşdırma; 2. *fiziol.* nəcis ifraz etmə, qarnını boşaltma

**defect¹** [dı'fekt] *n* 1. defekt, nöqsan, qüsur, eyib; **a ~ in a character** xarakterdə qüsur / nöqsan; **genetic ~s** genetik qüsurlar; **~ in the mechanism** mexanizmdə defekt / qüsur / nöqsan; **mechanical ~s in a car** maşında mexaniki defektlər / qüsurlar; *The machine is unsafe because of the defects in it İçində olan defektlərə / qüsurlara görə maşın təhlükəlidir;* **~s in the education system** təhsil sistemindəki qüsurlar / nöqsanlar; *It's quite evident that our education system has certain defects Tamamilə aydındır ki, bizim təhsil sistemimizdə müəyyən qüsurlar / nöqsanlar var;* 2. çatışmazlıq, çatışmayan miqdar

**defect²** [dı'fekt] *v* dəyişmək, dezertirlik / fərarilik etmək, qaçmaq, düşmən cəbhəsinə keçmək; **to ~ to the enemy** düşmən tərəfinə / cəbhəsinə keçmək

**defection** [dı'fekʃn] *n* 1. pozma *(etibarı, borcu)*; xainlik, dönüklük, mürtədlik; qopma; ayrılma; dezertirlik, fərarilik, qaçma; 2. iflas, iflasa uğrama; müvəffəqiyyətsizlik, uğursuzluq

**defective** [dı'fektıv] *adj* 1. natamam, yarımçıq, qüsurlu; qeyri-mükəmməl, nöqsanlı; **~ rules** nöqsanlı / qüsurlu qaydalar; **~ pronunciation** qüsurlu/nöqsanlı tələffüz; **a ~ method** yarımçıq / qüsurlu / nöqsanlı metod; **a ~ theory** qeyri-mükəmməl / natamam nəzəriyyə; *The translation is defective Tərcümə qüsurludur / nöqsanlıdır;* 2. nasaz, xarab, zədələnmiş, zədə almış; pis; **~ machine** nasaz maşın; **~ memory** pis

yaddaş; 3. əqli cəhətdən/baxımdan inkişaf etməmiş, inkişafdan qalmış; 4. *qram.* çatışmayan fel *(yəni bəzi qrammatik forması olmayan);* ~ **verbs** çatışmayan fellər; ***Must** is a defective verb **Must** çatışmayan feldir*

**defectively** [dɪ'fektɪvlɪ] *adv* az, qeyri-kafi, yetişməyəcək qədər, kifayət etməyəcək dərəcədə; nöqsanla, qüsurla, kəsirlə

**defectiveness** [dɪ'fektɪvnɪs] *n* qeyri-kafilik; qüsurluluq, nöqsanlılıq, qeyri-mükəmməllik, natamamlıq

**defector** [dɪ'fektə^r] *n* dönük; dezertir, fərari, qaçaq; düşmən tərəfinə keçən adam, düşmənə satılmış adam; vətənə qayıtmayan adam

**defence** [dɪ'fens] *n* 1. müdafiə; mühafizə; müdafiə etmə; qoruma; **the ~ of *one's* country** vətənini qoruma /müdafiə etmə; **Department of Defence** *amer.* Müdafiə Nazirliyi; *Trees are a defence against wind Ağaclar küləkdən müdafiədir;* **in ~ of peace** sülhün müdafiəsi naminə; **to die in ~ of liberty** azadlıq uğrunda həlak olmaq / ölmək; **national ~** milli müdafiə, ölkənin müdafiəsi; **weapons of ~** müdafiə silahları; **the system of collective ~** kollektiv müdafiə sistemi; **to make a good ~ against the enemy** düşməndən yaxşı müdafiə olunmaq; *Best defence is offence Hücum ən yaxşı müdafiədir;* 2. *hərb.* müdafiə xətti, istehkam, müdafiə sistemi; **coast ~s** sahil istehkamları; 3. *hüq.* özünü müdafiə edən tərəf *(məhkəmədə);* **the counsel/wintnesses for the ~** müttəhimin vəkili / şahidləri; 4. vəkilin nitqi; 5. *id.* müdafiə; **team ~** bütün komanda ilə müdafiə; **man-to-man ~** oyunçunun oyunçuya qarşı müdafiəsi;

◊ **the science / art of ~** boks

**defenceless** [dɪ'fenslɪs] *adj* 1. müdafiəsiz, müdafiə olunmayan; **a ~ city** müdafiəsiz şəhər; **a ~ animal** müdafiəsiz heyvan; 2. kimsəsiz, köməksiz, arxasız; **a ~ child** kimsəsiz / köməksiz uşaq

**defencelessness** [dɪ'fenslɪsnɪs] *n* müdafiəsizlik; arxasızlıq, kimsəsizlik, köməksizlik; **the ~ of the city** şəhərin müdafiəsizliyi; **the ~ of a child** uşağın köməksizliyi

**defenceman** [dɪ'fensmən] *n (pl* **-men** [-mən]) *id.* müdafiəçi *(futbol, hokkey oyunlarında)*

**defend** [dɪ'fend] *v* 1. müdafiə / mühafizə / himayə etmək, qorumaq; **to ~ *one's* country against enemies** vətənini düşmənlərdən müdafiə etmək; **to ~ *smb.*** bir kəsi müdafiə etmək; **to ~ oneself from / against *smb.*** özünü bir kəsdən qorumaq; **to ~ a town** şəhəri müdafiə etmək / qorumaq; **to ~ *one's* cause / ideas / leader** öz işini / ideyalarını / rəhbərini müdafiə etmək; 2. müdafiə olunmaq / qorunmaq *(həm də id.); When the dog attacked me, I defended myself with a stick It mənə hücum edəndə mən özümü əl ağacı ilə qorudum;* 3. *hüq.* məhkəmədə müdafiə etmək, vəkil kimi çıxış etmək; müdafiə olunmaq, özünün günahkar olduğunu inkar etmək *(müttəhim haq.);*

◊ *God defend! Allah sən saxla!*

**defendant** [dɪ'fendənt] *n* 1. *hüq.* cavabdeh; 2. müqəssir, müttəhim

**defended** [dɪ'fendɪd] *adj* müdafiə/mühafizə olunan; **~ post** *hərb.* müdafiə olunan mövqe / post *(növbətçi yeri)*

**defender** [dɪ'fendə^r] *n* 1. müdafiəçi, tərəfdar, havadar; **~s of peace** sülh tərəfdarları; **~s of human rights** insan hüquqlarının müdafiəçiləri; 2. *id.* müdafiəçi; *He had to beat several defenders to score Hesabı açmaq üçün o bir neçə müdafiəçini keçməli oldu;* 3. *id.* öz adını saxlamaq uğrunda mübarizə aparan çempion

**defending line** [dɪ'fendɪŋ'laɪn] *n id.* müdafiə xətti

**defense** [dɪ'fens] *n* = **defence;**

**defenseless** [dɪ'fenslɪs] *adj* = **defenceless**

**defenseman** [dɪ'fensmən] *n (pl* **-men** [-mən]) = **defenceman**

**defensible** [dɪ'fensəbl] *adj* müdafiə oluna bilən; müdafiəyə layiq; **a ~ castle** müdafiə oluna bilən qəsr; **a ~ theory** müdafiəyə layiq nəzəriyyə

**defensive**[1] [dɪ'fensɪv] *n* müdafiə, müdafiə mövqeyi; **to be/to stand on the ~** müdafiə olunmaq, müdafiədə olmaq, müdafiə mövqeyi tutmaq; **to take on the ~** müdafiəyə keçmək; **to throw *smb.* on the ~** bir kəsi müdafiə olunmağa məcbur/vadar etmək; *The team was on the defensive Komanda müdafiə mövqeyi tutmuşdu*

**defensive**[2] [dɪ'fensɪv] *adj* 1. qoruyucu, mühafizəedici; **~ armour** qoruyucu zireh; **~ fire** *hərb.* mühafizəedici atəş; 2. müdafiə *(həm də id.);* **~ warfare** müdafiə əməliyyatları; **~ installations** müdafiə qurğuları; **~ position** müdafiə mövqeyi

**defensively** [dɪ'fensɪvlɪ] *adv* müdafiə olunaraq, müdafiədə duraraq

**defensiveness** [dɪ'fensɪvnɪs] *n* müdafiəçilik, müdafiə olunma

**defer** [dɪ'fəː^r] *v* I 1. təxirə salmaq, başqa vaxta keçirmək, sonraya qoymaq, yubatmaq; **to ~ a visit** görüşü təxirə salmaq; **to ~ payments** ödəmənin vaxtını uzatmaq; **to ~ a discussion** müzakirəni təxirə salmaq / yubatmaq; **to ~ writing the answer** cavab yazmağı yubatmaq; 2. *hərb.* çağırışdan möhlət vermək

**defer** [dɪ'fəː^r] *v* II 1. **(to)** hesablaşmaq *(bir kəsin fikri ilə);* 2. ümid / arxayın olmaq, belbağlamaq *(bir kəsə);* 3. güzəşt etmək, güzəştə getmək; tabe/təslim olmaq; qulaq asmaq *(bir kəsin arzusuna);* **to ~ to *smb.'s* opinion/judgement** bir kəsin fikrini/rəyini nəzərə almaq; **to ~ to *smb.'s* authority** bir kəsin nüfuzuna/avtoritetinə belbağlamaq; *I'll defer to your advice Mən sənin/sizin məsləhətinə/məsləhətinizə qulaq asacam;* 4. *hüq. arx.* vermək, bağışlamaq, hədiyyə vermək



**deference** ['defərəns] *n* 1. hörmət, ehtiram; **to pay / to show ~ to *smb.*, to treat *smb.* with ~** bir kəsə hörmətlə/ehtiramla yanaşmaq, bir kəsə hörmət/ehtiram göstərmək; **in/out of ~ to the court** məhkəməyə hörmət /ehtiram əlaməti olaraq; **in ~ to your wishes** sənin/sizin arzularını/ arzularınızı nəzərə alaraq

**deferential** [ˌdefə'renʃəl] *adj* hörmətli, ehtiramlı, möhtərəm

**deferentially** [ˌdefə'renʃəlɪ] *adv* hörmətlə, ehtiramla

**deferment** [dɪ'fəːmənt] *n* 1. təxirə salma, təxir; 2. *hərb.* vaxtı uzadılma; möhlət

**deferred** [dɪ'fəːd] *adj* 1. təxirə salınmış, möhlət verilmiş, vaxtı/müddəti uzadılmış; **~ annuity** illik rentanın/gəlirin ödəmə müddətinin / vaxtının uzadılması; **~ debt** vaxtı / müddəti uzadılmış borc; 2. endirilmiş, azaldılmış; **~ rate** endirilmiş tarif; 3. *hərb.* müddət almış; 4. ləngidilmiş, yubadılmış; 5. gələcək üçün planlaşdırılmış; **~ income/ credit** gələcək gəlir hesabına ayrılmış avans

**defiance** [dɪ'faɪəns] *n* ədəbsiz/həyasız davranış, açıq itaətsizlik, laqeydlik; **~ of a resolution** qətnaməni yerinə yetirməmə; **to bid ~ to *smb.*, to set *smb.* at ~** bir kəslə hesablaşmamaq, bir kəsi heç nəyə hesab etməmək; *I set him and his threats at defiance Mən onu və onun hədələrini vecimə almıram;*

◊ **in ~ of *smth.*** bir şeylə hesablaşmadan, bir şeyə tam laqeydlik göstərərək, bir şeyi vecinə almadan

**defiant** [dɪ'faɪənt] *adj* 1. itaətsiz, itaət etməyən, tabe olmayan; boyun əyməyən; dikbaş, lovğa, qaba, ədəbsiz; ötkəm, sözqaytaran; **a ~ manner** qaba/ədəbsiz/lovğa hərəkət; **a ~ look** ötkəm /lovğa baxış; **a ~ speech** lovğa/ötkəm nitq; **~ words** qaba/ ötkəm /ədəbsiz sözlər; **a ~ attitude** qaba/ ədəbsiz münasibət; 2. heç kəsə inanmayan/etibar etməyən; hər şeydən şübhələnən

**defiantly** [dɪ'faɪəntlɪ] *adv* 1. ədəbsizcəsinə, ədəbsizliklə, həyasızcasına, kobudcasına, ədəbsiz bir tərzdə; 2. nümayişkaranə, açıq-açığına, qəsdən, bilə-bilə

**deficiency** [dɪ'fɪʃənsɪ] *n* 1. yoxluq, olmama *(bir şey);* qıtlıq, çatmama, əskik gəlmə; kəsir; defisit; **~ of food** ərzaqın yoxluğu/çatmaması /qıtlığı; **~ of air** havanın yoxluğu/olmaması/çatmaması; *Vitamin deficiency can lead to illness Vitamin çatışmazlığı xəstəliyə gətirib çıxarar;* **a ~ of ten pounds** on funt əksik; 2. nöqsan, qüsur, eyib; **~ of intellect** əqli nöqsan/çatışmazlıq; **mental ~** kəmağıllıq, ağıl zəifliyi; *Her deficiencies as a writer are all too clear Onun yazıçı kimi bütün nöqsanları tam gözə çarpır*

**deficient** [dɪ'fɪʃənt] *adj* 1. məhrum *(bir şeydən);* qeyri-mükəmməl, yarımçıq, natamam, nöqsanlı; qeyri-qənaətbəxş; **a ~ supply of water** suyun qeyri-qənaətbəxş təminatı; **a diet ~ in iron** dəmir olmayan /çatışmayan pəhriz; **to be ~ in experience** təcrübəsi çatmamaq; **to be ~ in knowledge** biliyi kəsirli olmaq/çatışmamaq; *Our knowledge of the universe is still extraordinarily deficient Bizim kainat haqqında biliyimiz hələ də qeyri-kafidir;* 2. çatmayan, çatışmayan, əskik olan; **~ amount** çatışmayan/əskik olan məbləğ *(pul haq.)*

**deficiently** [dɪ'fɪʃəntlɪ] *adv* az, qeyri-kafi, yetişməyəcək / kifayət etməyəcək dərəcədə; natamam, qeyri-mükəmməl

**deficit** ['defɪsɪt] *n* defisit, çatışmazlıq; **a budget ~** büdcədə kəsiri; **payments ~** ödəmə balansının çatışmazlığı

**defied** [dɪ'faɪd] **to defy** *felinin pt, pp forması*

**defile**[1] [dɪ'faɪl, 'diːfaɪl] *n* dar keçid *(dağ yerində)*

**defile**[2] [dɪ'faɪl] *v* 1. çirkləndirmək, bulamaq, batırmaq, korlamaq; **to ~ the woods** meşəni çirkləndirmək *(kağız, butulka və s. atmaqla);* **to ~ *smb.'s* minds** bir kəsin beynini/düşüncəsini korlamaq; *Does pornography defile the minds of its readers? Pornoqrafik ədəbiyyat oxucularının beynini/düşüncəsini korlayırmı?;* 2. murdarlamaq; ləkələmək, təhqir etmək *(müqəddəs yeri); The altar had been defiled by vandals Mehrab / Səcdəgah barbarlar tərəfindən təhqir edilmişdi;* **to ~ the marriage-bed** ər-arvadlıq yatağını təhqir etmək /ləkələmək

**defilement** [dɪ'faɪlmənt] *n* 1. çirkləndirmə, kirləndirmə, batırma, bulaşdırma; 2. murdarlama, murdarlanma, təhqir etmə/edilmə; 3. *arx.* zorlama, qızlığını / bəkarətini alma; əxlaqını pozma; yoldan çıxarma/çıxardılma, başdan çıxartma, pis yola düşmə

**definable** [dɪ'faɪnəbl] *adj* təyin oluna/edilə bilən, müəyyən edilə bilən, tərif verilə bilən

**define** [dɪ'faɪn] *v* 1. təyin/ müəyyən etmək; müəyyənləşdirmək; **to ~ a term** termini müəyyən etmək; *Writers of dictionaries try to define words as accurately and clearly as possible Lüğət yazanlar sözləri mümkün qədər dəqiq və aydın müəyyənləşdirməyə çalışırlar;* **to ~ *one's* position** öz münasibətini/rəyini bildirmək; **to ~ *smb.'s* duties** bir kəsin vəzifələrini müəyyənləşdirmək; *The powers of a judge are defined by law Hakimin səlahiyyətləri qanunla müəyyən edilir;* 2. sərhədi müəyyənləşdirmək; *When boundaries between countries are not clearly defined, there is usually trouble Ölkələr arasında sərhədlər qəti olaraq müəyyənləşdirilmədikdə adətən narahatlıq/xoşagəlməyən hadisələr olur;* 3. aydın görünmək; *The mountain was sharply defined against the eastern sky Dağ şərqdə səmanın fonunda aydın görünürdü*

**definite** ['defɪnɪt] *adj* 1. aydın, dəqiq, şübhəsiz; **~ opinion** aydın / dəqiq fikir; **~ time** dəqiq vaxt; **~ place** dəqiq yer; **~ period** müəyyən dövr; **~ dimensions** dəqiq ölçülər; **~ statement** dəqiq

molumat; ~ **decision** dəqiq /aydın qərar; ~ **result** şübhə doğurmayan / dəqiq nəticə; *I have no definite plan for tomorrow Mənim sabah üçün dəqiq / müəyyən planım yoxdur; I want a definite answer, "yes" or "no" Mən qəti / dəqiq cavab istəyirəm "bəli" və ya "yox"*; **2.** *qram.* müəyyənlik; **the ~ article** müəyyənlik artikli

**definitely** ['definıtlı] *adv* **1.** aydın, dəqiq, qəti, qəti/aşkar surətdə; dürüst, tamamilə düzgün; **2.** *d.d.* şübhəsiz, əlbəttə

**definiteness** ['definıtnıs] *n* müəyyənlik, qətilik; aşkarlıq, aydınlıq, açıqlıq, dəqiqlik; şübhəsizlik

**definition** [.defi'nıʃn] *n* **1.** təyin etmə / edilmə; tərif; **the ~ of the sentence** cümlənin tərifi; cümlənin təyin edilməsi; **to give a ~ tərif** vermək; **to give a ~ to the sentence** cümləyə tərif vermək; *A perfect definition of the sentence has not been given yet Cümləyə hələ də kamil tərif verilməmişdir;* **2.** aydınlıq, açıqlıq; *The photograph has poor definition Fotoşəklin aydınlığı zəifdir*

**definitive** [dı'finıtıv] *adj* **1.** qəti, son; ~ **answer / sentence** qəti cavab / hökm; **2.** tam, dürüst, dəqiq, doğru; ~ **text of a poem** poemanın tam mətni; **3.** fərqləndirici, xarakterik, səciyyəvi, əsas; ~ **distinctions** fərqləndirici /səciyyəvi fərqlər; **4.** *qram.* təyin edən, təyinedici, təyin rolunda çıxış edən

**definitively** [dı'finıtıvlı] *adv* qəti surətdə / olaraq, tamamilə, bütünlüklə, dönmədən, həmişəlik olaraq

**deflate** [dı'fleıt] *v* **1.** boşaltmaq, havanı/ qazı buraxmaq *(bir şeydən);* **to ~ a balloon /a tire** şarın / şinin havasını boşaltmaq; **2.** buraxmaq *(şinin, şarın içindəki havanı);* **3.** *mal.* kağız pul buraxmağı azaltmaq; **4.** qiyməti aşağı salmaq; **5.** təkzib etmək, yalana çıxartmaq, yalan olduğunu sübuta yetirmək; **to ~ a rumour** şayiəni təkzib etmək / yalana çıxartmaq

**deflation** [dı'fleıʃn] *n* **1.** qazı/havanı buraxma; **2.** *mal.* deflyasiya *(tədavüldə olan kağız pulların miqdarının azalması);* **3.** *geol.* küləyin təsiri nəticəsində baş verən eroziya *(yer qabığının dağılması prosesi)*

**deflect** [dı'flekt] *v* **1.** əymək; sapdırmaq; daşındırmaq; vaz keçmək; istiqamətini dəyişdirmək *(bir şeyin)*; **to ~ a magnetic needle** maqnit əqrəbinin istiqamətini dəyişdirmək / sapdırmaq; **to ~ *smb.'s* thoughts from *smth.*** bir kəsin fikirlərini bir şeydən daşındırmaq/yayındırmaq; *The bullet deflected from the wall Güllə divardan sapdı; She will not be easily deflected from her purpose Onu məqsədindən daşındırmaq çox da asan olmayacaq*; **2.** əyilmək, meyl etmək; sapmaq; **to ~ to the right** sağa əyilmək/meyl etmək; **3.** dəyişdirmək *(söhbətin mövzusunu və s.)*; yayındırmaq; **to ~ *smb.'s* judgement** bir kəsi öz fikrindən daşındırmaq/yayındırmaq

**deflected** [dı'flektıd] *adj* əyilmiş, qatlanmış; ~ **septum** *tib.* burun çəpərinin əyilməsi

**deflection** [dı'flekʃn] *n* **1.** düz istiqamətdən yayınma / sapma; *The smallest deflection of the missile could bring disaster Raketin istiqamətdən kiçicik yayınması/sapması fəlakət yarada / doğura bilərdi;* **2.** *fiz.* maqnit meyli

**deflective** [dı'flektıv] *adj* əyilən, sapan, normadan kənara çıxan

**deflector** [dı'flektəʳ] *n* qaytarıcı, reflektor

**defloration** [.di:flɔ:'reıʃn] *n* **1.** qızlığını alma; **2.** gülləri dərmə / qopartma

**deflower** [di:'flauəʳ] *v* **1.** qızlığını almaq; **2.** çiçəkləri qopartmaq/dərmək/yolub tökmək / yolışdurmaq; **3.** *arx.* kitabdan ən yaxşı səhifəni cırıb çıxartmaq

**defoliate** [dı'foulıeıt] *v* **1.** yarpağını tökmək, yarpaqsızlaşdırmaq, yarpağını yolmaq *(bitkilərin və ya ağacların)*; **2.** bitkini məhv etmək *(kimyəvi vasitə işlətmək yolu ilə)*

**defoliation** [dı.foulı'eıʃn] *n* yarpağı tökmə, yarpaqsızlaşma

**deforest** [dı'fɔrıst] *v* meşəni qırmaq, meşəsizləşdirmək

**deforestation** [dı.fɔrıs'teıʃn] *n* meşəni qırma, meşəsizləşdirmə

**deform** [dı'fɔ:m] *v* **1.** eybəcərləşdirmək, eybəcər şəklə salmaq, çirkinləşdirmək; eybəcər etmək / hala salmaq; korlamaq, xarab etmək; *A disease had deformed his hands Xəstəlik onun əllərini eybəcər hala saldı;* **2.** formasını / şəklini dəyişdirmək; əymək; öz şəklini / formasını dəyişmək; əyilmək

**deformation** [.di:fɔ:'meıʃn] *n* **1.** eybəcərləşdirmə, eybəcər hala salma, əymə, əyilmə; **a ~ of the spine** onurğa sümüyünün əyilməsi; **2.** pisləşmə, xarablaşma; pisləşdirmə, xarablaşdırma; ağırlaşma; **3.** *tex.* deformasiya *(formanın/şəklin dəyişməsi)*

**deformed** [dı'fɔ:md] *adj* **1.** eybəcər hala salınmış, şikəst edilmiş; ~ **face** eybəcər hala salınmış üz /sifət; *He was born with a badly deformed foot O, anadan ayağı şikəst doğulmuşdur;* **2.** xarab edilmiş /olmuş; pozğun, pozulmuş; xəstə; ~ **imagination** xəstə təsəvvür

**deformity** [dı'fɔ:mıtı] *n* **1.** eybəcərlik, kifirlik, çirkinlik, biçimsizlik; **2.** çatışmazlıq, nöqsan, qüsur, eyib; çatmama, kəsir

**defossion** [dı'fɔʃn] *n tar.* diri-diri basdırılma / gömülmə / quyulama

**defraud** [dı'frɔ:d] *v* aldatmaq; əlindən almaq *(aldatmaqla);* dilə tutub almaq *(bir kəsdən);* **to ~ *smb.* of *smth.*** bir şeyi bir kəsdən dilə tutub / tovlayıb almaq; *She was defrauded by a dishonest accountant Fırıldaqçı mühasib onu aldatdı*

**defraudation** [.di:frɔ:'deıʃn] *n* aldatma, yalan, hiylə, fırıldaq, kələk, hiyləgərlik, dələduzluq



**defray** [dı'freı] *v* **1.** *mal.* ödəmək, haqqını / muzdunu / pulunu vermək; **to ~ the expenses** xərcləri ödəmək, xərci öz üzərinə götürmək; **2.** *arx.* əvəzini vermək, yerini doldurmaq

**defrayment** [dı'freımənt] *n* **1.** haqqını vermə /ödəmə, ödəniş; **2.** haqq, muzd, ödəniş, məbləğ

**defrost** [.dı:'frɔst] *v* **1.** əritmək *(buzu, yağı və s.);* donunu açmaq *(dondurulmuş ərzağın və s.); The fridge needs defrosting Soyuducunun/Buzxananın buzunu açmaq lazımdır;* **2.** ərimək, donu açılmaq *(dondurulmuş ərzağın); A frozen chicken should be allowed to defrost completely before cooking Bişirməzdən öncə dondurulmuş toyuğun/çolpanın donunu açmaq lazımdır; How long will it take to defrost this meat? Bu ətin donunun açılması nə qədər vaxt aparacaq?*

**defrostation** [di:'frɔs'teıʃn] *n* ərimə, donunu açma; ərimə, donu açılma *(ərzağın)*

**deft** [deft] *adj* **1.** cəld, diribaş, zirək, çevik; bacarıqlı, əlli-ayaqlı, mahir; məharətli, qabil, bacarıqlı; fəndgir; ~ **fingers** cəld / zirək barmaqlar; ~ **waiter** bacarıqlı / əlli-ayaqlı xörəkpaylayan; ~ **hands** bacarıqlı əllər; *She is a deft hand with the needle O tikməkdə mahirdir;* **2.** *dial.* səliqəli, təmizkar, təmiz; qəşəng, xoşagələn

**deftly** ['deftlı] *adv* mahiranə surətdə, məharətlə, ustalıqla; cəld, bacarıqla

**deftness** ['deftnıs] *n* mahirlik, ustalıq; cəldlik, bacarıqlılıq

**defunct**[1] [dı'fʌŋkt] *n* ölü, meyit, cənazə, mərhum

**defunct**[2] [dı'fʌŋkt] *adj* **1.** ölmüş, ölü, mərhum; **2.** yox olmuş, gözdən itmiş; qırılmış, qırılıb qurtarmış; sönmüş; ~ **stars** sönmüş / yox olmuş ulduzlar

**defunction** [dı'fʌŋkʃn] *n* ölüm, ölmə, vəfat etmə

**defy** [dı'faı] *v (pt, pp* **defied)** **1.** açıq-açığına rədd etmək, məhəl qoymamaq, saymamaq, əhəmiyyət verməmək, etinasızlıq göstərmək; **to ~ public opinion** ictimai rəyə / fikrə etinasızlıq göstərmək / əhəmiyyət verməmək; *She defied her parents and got married O, valideynlərini saymayaraq ərə getdi;* **to ~ the law** qanuna məhəl qoymamaq/etinasızlıq göstərmək /əhəmiyyət verməmək; **2.** dayana bilmək, davam gətirmək, qabağında dura bilmək; *The garrison defied enemy attacks for several days Qarnizon (qalada və ya şəhərdə yerləşdirilmiş qoşun dəstəsi) düşmənin hücumlarına bir neçə gün davam/tab gətirdi;* **3.** çətinlik *(həll edilməsi mümkün olmayan)* törətmək; imkan verməmək; mümkün olmamaq; *It defies definition / description Bu, tərifə / təsvirə gəlmir; The door defies all attempts to open it Bütün cəhdlərə baxmayaraq qapını açmaq mümkün deyil; The problem itself defies solution Problem özü öz həllinə imkan vermir*

**degas** [dı'gæs] *v* deqazasiya etmək, qazdan təmizləmək, zərərsizləşdirmək *(qazdan)*, zərərsiz hala salmaq *(qaz haq.)*

**degassing** [dı'gæsıŋ] *n* deqazasiya, qazdan təmizləmə, zərərsizləşdirmə, zəhərsiz hala salma *(qaz haq.)*

**degeneracy** [dı'dʒenərəsı] *n* **1.** nəsli / cinsi pozulma, cinsi xarab olma; cırlaşma, getdikcə xarablaşma/xarab olma; **2.** degenerativlik *(bax:* **degenerate**); **3.** düşkünlük; zəiflik, zəifləşmə; korlanma, pisləşmə

**degenerate**[1] [dı'dʒenərıt] *n* degenerat *(cismani və ruhi pozğunluq əlamətləri olan adam)*, eybəcər; *məc.* nacins, bədzat

**degenerate**[2] [dı'dʒenərıt] *adj* **1.** degenerativ *(bax:* **degenerate**[1]); **2.** nəsli pozulmuş, cırlaşmış, əslini itirmiş, pisləşmiş; **3.** əxlaqsız, əxlaqı pozulmuş/pozğun, tərbiyəsiz; tənəzzülə uğramış; ~ **behaviour** pozulmuş əxlaq/davranış; ~ **art** tənəzzülə uğramış sənət

**degenerate**[3] [dı'dʒenəreıt] *v* **1.** nəsli / cinsi pozulmaq, cırlaşmaq, nəsli kəsilmək; **2.** pisləşmək, pis hala düşmək; *His health is degenerating rapidly Onun səhhəti sürətlə pisləşir*

**degeneration** [dı'dʒenə'reıʃn] *n* **1.** tənəzzül; nəsli pozulma/xarab olma; cinsi pozulma, pisləşmə, degenerasiya; *məc.* pozulma, cırlaşma, getdikcə xarablaşma; **the ~ of the Roman Empire** Roma İmperiyasının tənəzzülü; **the slow ~ of his mental faculties** onun əqli qabiliyyətlərinin getdikcə pisləşməsi; **2.** degenerativlik *(bax:* **generate**[1])

**degenerative** [dı'dʒenərətıv] *adj tib.* getdikcə pisləşən / ağırlaşan ~ **disease** getdikcə pisləşən / ağırlaşan xəstəlik

**degradation** [.degrə'deıʃn] *n* **1.** tənəzzül, düşkünlük; geri getmə; xarablaşma, xarab olma, pisləşmə; nəsli kəsilmə/pozulma/ xarab olma; getdikcə pisləşmə; ~ **of meaning** *dilç.* mənanın pisləşməsi; **to undergo ~** tənəzzül etmək, geri getmək; xarablaşmaq, pisləşmək; nəsli/cinsi pozulmaq, cırlaşmaq, nəsli kəsilmək; **2.** endirmə; vəzifəsini/rütbəsini alçaltmaq; ~ **of a general** generalın rütbəsini aşağı salma

**degrade** [dı'greıd] *v* **1.** pisləşdirmək, xarablaşdırmaq, xarab etmək; pisləşmək, xarablaşmaq, xarab olmaq, tənəzzül etmək, geri getmək; **to ~ the theatre** teatrı tənəzzülə uğratmaq; **2.** aşağı salmaq *(qiyməti və s.);* **3.** vəzifəni / rütbəni aşağı salmaq; məhrum etmək *(vəzifəsini və s.);* **to ~ *smb.* from the priesthood** bir kəsi ruhanilik mənsəbindən məhrum etmək; **4.** alçaltmaq, hörmətdən salmaq; **to ~ oneself by cheating and telling lies** fırıldaqçılıq etmək və yalan danışmaqla özünü alçaltmaq; *Pornography degrades human dignity Pornoqrafiya insan ləyaqətini alçaldır;* **5.** *rəs.* rəngin / boyanın tonunu zəiflətmək; **to ~ the brilliancy of the dyes** boyaların parlaqlığını zəiflətmək / azaltmaq

**degraded** [dɪ'greɪdɪd] *adj* 1. tənəzzülə uğramış, geri getmiş, xarablaşmış, pisləşmiş; tənəzzül vəziyyətinə düşmüş; **in a ~ condition** təhqir olunmuş/tənəzzülə uğramış bir vəziyyətdə; 2. aşağı salınmış *(qiymət və s. haq.)*; 3. vəzifəsi / rütbəsi alçaldılmış; **a ~ soldier** rütbəsi aşağı salınmış əsgər; 4. hörmətdən /gözdən salınmış, təhqir edilmiş

**degrading** [dɪ'greɪdɪŋ] *adj* təhqiredici, alçaldıcı, həqarətli; **their humiliating and ~ treatment of prisoners** onların dustaqlara qarşı təhqiredici və alçaldıcı rəftarı

**degree** [dɪ'gri:] *n* 1. dərəcə; **ten ~s of heat / of cold / of frost** on dərəcə isti / soyuq / şaxta; *Water freezes at zero / nought degrees Celsius Su selsi ilə sıfır dərəcədə donur;* **~ of skill** ustalıq dərəcəsi; *She shows a high degree of skill in her work O öz işində yüksək ustalıq göstərir; I agree with you to a certain degree Mən sənin-lə/sizinlə müəyyən dərəcədə razıyam;* 2. dərəcə, elmi ad; **honorary ~** fəxri dərəcə; **the ~ of bachelor/of master / of doctor** bakalavr / magistr / doktor dərəcəsi; **to study for a ~** bakalavr dərəcəsi almaq üçün imtahana hazırlaşmaq; **to take *one's* ~** dərəcə almaq; **to take a poll ~** universiteti adi diplomla bitirmək *(Kembric universitetini)*; **to have a London ~** London universitetində dərəcə almaq; 3. *id.* dərəcə; **advanced ~** *id.* ikinci dərəcə; 4. *hüq. amer.* dərəcə *(cinayət haq.)*; **principal in the first ~** əsas cinayətkar; **principal in the second ~** cinayətdə əli olan; 5. *qram.* dərəcə; **positive / comparative/superlative ~** adi/müqayisə /üstünlük dərəcəsi; **~s of comparison** müqayisə dərəcələri; *In English adjectives have three degrees of comparison İngilis dilində sifətlərin üç dərəcəsi var;* 6. *riyaz.* dərəcə; **an angle of ninety ~s** doxsan dərəcə altında bucaq; **the second ~** kvadrat; **the third ~** kub;

◊ **by ~s** tədricən, yavaş-yavaş; *By degrees their friendship grew into love Onların dostluğu tədricən sevgiyə çevrildi;* **the third ~** işgəncə verməklə aparılan istintaq; **to get the third ~** işgəncəyə məruz qalmaq

**degreeless** [dɪ'gri:lɪs] *adj* dərəcəsiz, elmi adı olmayan

**dehorn** [di:'hɔ:n] *v* buynuzunu kəsmək

**dehumanisation** [di:.hju:mənaɪ'zeɪʃn] *n* = **dehumanization**

**dehumanise** [di:'hju:mənaɪz] *v* = **dehumanize**

**dehumanization** [di:.hju:mənaɪ'zeɪʃn] *n* insanlıqdan çıxartma, daşqəlbli / amansız etmə, qəddarlaşdırma, vəhşiləşdirmə

**dehumanize** [di:'hju:mənaɪz] *v* insanlıqdan çıxartmaq, daşqəlbli / rəhmsiz / amansız etmək, qəddarlaşdırmaq, simasızlaşdırmaq, vəhşiləşdirmək; *Torture always dehumanise both the torturer and the victim İşgəncə həm işgəncə verəni, həm də işgəncəyə məruz qalanı insansızlaşdırır / qəddarlaşdırır*

**dehumidify** [.di:hju'mɪdɪfaɪ] *v* qurutmaq, nəmini almaq / götürmək

**dehydrate** [di:'haɪdreɪt] *v kim.* susuzlaşdırmaq, suyunu qurutmaq/çəkmək, nəmini / suyunu almaq, qurutmaq; **~d milk in powdered form** qurudulub toz halına salınmış süd

**dehydration** [.di:haɪ'dreɪʃn] *n kim.* susuzlaşdırma, suyunu qurutma / çəkmə; qurutma, nəmini / suyunu alma

**de-ice** ['di:'aɪs] *v* buzunu almaq, buz bağlamanın qarşısını almaq

**de-icer** ['di:'aɪsəʳ] *n* buzlanmanın qarşısını almaq və ya buzdan təmizləmək üçün işlədilən maddə

**de-icing** ['di:'aɪsɪŋ] *n* buz tutma ilə mübarizə *(gəmi, təyyarə və ya cihazlarda)*

**deification** [.di:ɪfɪ'keɪʃn] *n* ilahiləşdirmə, təqdis etmə, ilahiləşdirilmə

**deiform** ['di:ɪfɔ:m] *adj* 1. allahabənzər, allahaoxşar, allah kimi; 2. dini; *məc.* ilahi, çox gözəl / qəşəng

**deify** ['di:ɪfaɪ] *v* 1. ilahiləşdirmək, təqdis etmək; 2. *məc.* pərəstiş / sitayiş etmək; ilahiləşdirmək, çox sevmək; **to ~ money** pulu ilahiləşdirmək; *Primitive peoples deified the sun İbtidai adamlar günəşi ilahiləşdirirdilər / allah hesab edirdilər*

**deign** [deɪn] *v* iltifat göstərmək / etmək, lazım bilmək, layiq görmək; *Will you deign to answer my question Bəlkə iltifat göstərib mənim sualıma cavab verəsiniz; He did not deign to come O gəlməyi lazım bilmədi; He walked past me without even deigning to look at me O mənim yanımdan ötüb keçdi, hətta iltifat göstərib mənə baxmadı*

**deity** ['di:ɪtɪ] *n* 1. ilahilik, ülviyyət; 2. allah; **Roman deities** Roma allahları; səcdəgah, sitayiş edilən şey; **pagan deities** bütpərəstlik allahları; **the Deity** Allah

**deject**[1] [dɪ'dʒekt] *adj arx.* 1. devrilmiş, yıxılmış, çevrilmiş; 2. alçaldılmış, hörmətdən salınmış, təhqir edilmiş

**deject**[2] [dɪ'dʒekt] *v* 1. kədərləndirmək, məyus/dilxor etmək, zülm etmək, əsarət altına almaq, əzmək, əziyyət vermək; sarsıtmaq, boğmaq; **to ~ *smb.'s* spirits** bir kəsin ovqatını təlx etmək / korlamaq; 2. *arx.* devirmək, yıxmaq

**dejected** [dɪ'dʒektɪd] *adj* qəmgin, kədərli, pərt, dilxor, məyus, ruhdan düşmüş

**dejectedly** [dɪ'dʒektɪdlɪ] *adv* pərt olmuş, pərt tərzdə, ruhdan düşmüş halda, kədərlə, qəmgin-qəmgin

**dejection** [dɪ'dʒekʃn] *n* ümidsizlik, məyusluq, qəm, kədər, qüssə; ruhdan düşmə, ruhən əzginlik

**delay**[1] [dɪ'leɪ] *n* 1. ləngimə, yubanma, gecikmə; ləngitmə, yubatma, gecikdirmə; təxir; **unexpected ~** gözlənilməz ləngimə /yubanma /gecikmə; **long ~** uzun ləngimə /yubanma/gecikmə; **without ~** ləngimədən, yubanmadan; *We must inform them without delay Biz ləngimədən/yubanmadan onları xəbərdar etməliyik;* **a ~ of two hours, a two-hour ~** iki saatlıq ləngimə / yubanma /gecikmə; *There was a delay of two hours / a two-hour delay before the plane took off Təyyarə uçmazdan əvvəl iki saat ləngidi/yubandı;* 2. işsiz/boş dayanma; **avoidable/unavoidable ~** fəhlədən asılı olan / asılı olmayan işsiz / boş dayanma

**delay**[2] [dɪ'leɪ] *v* 1. ləngitmək, yubatmaq, gecikdirmək; ləngimək, yubanmaq, gecikmək; *Don't delay! Do the work today! Ləngitmə! /Ləngitməyin! İşi bu gün qurtar/qurtarın! She delayed (for) five minutes and missed the train O, beş dəqiqə ləngidi/yubandı/gecikdi və qatara çatmadı; The train has been delayed due to snow Qatar qara görə ləngiyib / yubanıb;* 2. təxirə salmaq, vaxtını dəyişdirmək/uzatmaq, möhlətini uzatmaq; **to ~ the attack for four days** hücumu dörd gün təxirə salmaq; *We'll have to delay our journey until the weather improves Hava düzələnə qədər biz səyahətimizi təxirə salmalı olacağıq; Why have they delayed opening the school? Onlar nə üçün məktəbin açılmasını təxirə salıblar?*

**delayed** [dɪ'leɪd] *adj* yavaşıdılmış, təxirə salınmış, yubadılmış; saxlanılmış, gecikdirilmiş; **~ action** yavaşıdılmış hərəkət; **~ drop** *av.* sürəkli tullanış *(paraşütlə)*

**delectable** [dɪ'lektəbl] *adj şair.* valehedici, heyranedici, məftunedici, çox gözəl, cazibəli; ləzzətli, həzzverici, nəşələndirici, könülaçan; **a ~ meal** ləzzətli / çox gözəl xörək / yemək; *What delectable food you cook Sən / Siz nə ləzzətli xörək / yemək bişirirsən / bişirirsiniz;* **a ~ performance** çox gözəl tamaşa

**delectation** [.dɪ:lek'teɪʃn] *n* ləzzət, zövq, nəşə, həzz; kef; əyləncə; **for *one's* ~** öz kefi üçün; *For the delectation of his friends, he did special magic tricks O, dostlarını əyləndirmək xatirinə xüsusi olaraq sehrli fokuslar göstərirdi*

**delegate**[1] ['delɪgɪt] *n* deleqat, nümayəndə, elçi, təmsilçi, müvəkkil, müjdəçi; *The symposium was attended by delegates from many countries Simpoziumda bir çox ölkələrdən nümayəndə iştirak edirdi*

**delegate**[2] ['delɪgeɪt] *v* 1. nümayəndə göndərmək; göndərmək; 2. səlahiyyət / ixtiyar vermək, vəkil etmək, vəkalət vermək; **to ~ rights to *smb.*** bir kəsə səlahiyyət / ixtiyar / hüquq / vəkalət vermək; **to ~ the power to a deputy** millət vəkilinə səlahiyyət vermək; **to ~ *(to) smb.* to do *smth.*** bir kəsə bir işi görmək üçün səlahiyyət / vəkalət vermək; *The job had to be delegated to an assistant İşi görmək üçün müavinə səlahiyyət verilməli oldu*

**delegation** [.delɪ'geɪʃn] *n* 1. nümayəndə heyəti, nümayəndələr; **to meet the ~** nümayəndə heyətini qarşılamaq; *The prime minister refused to meet the delegation Baş nazir nümayəndə heyətini qəbul etməkdən imtina etdi;* 2. nümayəndə göndərmə

**delegatory** ['delɪgətərɪ] *adj* deleqat

**delete** [dɪ'li:t] *v* pozmaq, silmək; **to ~ a word** sözü pozmaq; *His name was deleted from the list Onun adı siyahıdan pozuldu; The editor deleted the last paragraph from my article Redaktor mənim məqaləmin axırıncı abzasını pozdu/pozub çıxartdı*

**deleterious** [.delɪ'tɪərɪəs] *adj* ziyanlı, ziyanverən, ziyan gətirən; zəhərli; **~ gas** zəhərli qaz; **~ influence** ziyanlı / məhvedici təsir

**deletion** [dɪ'li:ʃn] *n* pozma, düzəliş, qaralama, silmə; pozulma, qaralanma, silinmə; **to make ~s to a manuscript** əlyazmasında düzəliş etmək

**deliberate**[1] [dɪ'lɪbrɪt] *adj* 1. qəsdən/ qərəzlə edilən, bilə-bilə edilən, qabaqcadan düşünülmüş; **~ action** düşünülmüş hərəkət; *The government is taking deliberate action to lower prices Dövlət qiymətləri aşağı salmaq üçün düşünülmüş hərəkət edir;* 2. qəsdən, məqsədli; **~ murder** qəsdən törədilmiş qətl; *The shooting was not accident, but a deliberate attempt to kill him Atəş təsadüfi deyildi, onu öldürmək üçün qəsdən düşünülmüş cəhd idi;* **the ~ killing of unarmed civilians** silahsız vətəndaşları qəsdən qırma/öldürmə; **a ~ and cynical lie** qərəzli və həyasız yalan; 3. təmkinli; ləng, astatərpənən, ağırtərpənən, tələsməyən; **to go with ~ steps** ağır addımlarla/tələsmədən getmək; *The old man rose from his chair in a deliberate way and left the room Qoca kişi tələsmədən/ağır-ağır stulundan qalxdı və otağı tərk etdi*

**deliberate**[2] [dɪ'lɪbəreɪt] *v* fikirləşmək, düşünmək, götür-qoy etmək; ətraflı düşünmək; ölçüb-biçmək, mülahizə etmək; **to ~ on a question** məsələ üzərində fikirləşmək /düşünmək; *She deliberated on my question for a moment and then spoke O mənim sualım üzərində bir an fikirləşdi və sonra danışdı;* **to ~ what to do** nə etmək barədə düşünmək; **to ~ whether to leave or not** tərk etmək yaxud qalmaq barədə götür-qoy etmək

**deliberately** [dɪ'lɪbərɪtlɪ] *adv* 1. qəsdlə, qəsdən, qərəzlə, qabaqcadan düşünülərək, bilə-bilə, bilərəkdən; 2. ətraflı düşünərək; ehtiyatla, ehmallı, üsulla, ehtikarlıqla; 3. tələsmədən, ağır-ağır, ləng bir surətdə

**deliberateness** [dɪ'lɪbərɪtnɪs] *n* 1. qəsdən / qərəzlə edilmə, bilə-bilə edilmə; niyyət, qəsd, qərəz, məqsəd; 2. ətraflı düşünmə, təfərrüatına qədər düşünmə; ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq; 3. tələsməmə, ləngik, yubanma

**deliberation** [dɪ.lɪbə'reɪʃn] *n* 1. düşünmə, fikirləşmə, ətraflı düşünmə; götür-qoy etmə; **after long**

~ uzun müddət düşündükdən / götür-qoy etdikdən sonra; *After deliberation, they decided not to buy the car Uzun götür-qoydan sonra onlar qərara gəldilər ki, maşını almasınlar;* 2. müzakirə, diskussiya, mübahisə; 3. ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq; **with** ~ ehtiyatla, tələsmədən; yavaş-yavaş; **with great** ~ çox böyük ehtiyatla

**deliberative** [dı'lıbərətıv] *adj* məsləhətçi, məşvərətçi; ~ **body** məsləhətçi/məşvərətçi orqan

**delicacy** ['delıkəsı] *n* 1. incəlik, zəriflik; nəfislik; təfərrüat; ~ **of taste** zövqün incəliyi/zərifliyi; ~ **of observation** müşahidənin təfərrüatı/incəliyi; ~ **of feeling and thought** hiss və fikrin yüksəkliyi; 2. zəriflik, qəşənglik, gözəllik; ~ **of features** sifət cizgilərinin zərifliyi/qəşəngliyi; ~ **of skin** dərinin zərifliyi; 3. yumşaqlıq, zəriflik *(boya, çalar haq.)*; 4. zəiflik, kövrəklik, incəlik; xəstəlik; ~ **of health** səhhətin zəifliyi; 5. nəzakət, ədəb; mərifət, qanacaq; **to show** ~ **in expressing sympathy** hüsn-rəğbətini nəzakətlə bildirmək; 6. xırdaçılıq, vasvasılıq, son dərəcə prinsipiallıq; mürəkkəblik; ~ **of the position / the situation** vəziyyətin çətinliyi; 7. həssaslıq, dəqiqlik *(cihazlar haq.)*; ~ **of a balance** tərəzinin dəqiqliyi / həssaslığı; **to show** *smth.* **with great** ~ bir şeyi tam dəqiqliyi ilə göstərmək; 8. delikates, məzə, zərif/dadlı/ləzzətli yemək; **the delicacies of the season** ilin bu vaxtında çətin tapılan yemək; novbar meyvə, tərəvəz və s.

**delicate** ['delıkıt] *adj* 1. incə, zərif, nazik, gözəl; ~ **taste** incə / zərif zövq; ~ **flowers** incə / zərif / gözəl çiçəklər; ~ **style** incə / zərif üslub; ~ **figure** zərif / gözəl boy-buxun; 2. kövrək, tezsınan; zəif; ~ **china** kövrək / tezsınan çini qab; **a** ~ **mechanizm** kövrək/tezsınan mexanizm; 3. zəif, xəstə; ~ **health** zəif/xəstə səhhət; ~ **lungs** zəif ağ ciyərlər; ~ **child** zəif / xəstə uşaq; 4. həssas, dəqiq; ~ **balance** həssas / dəqiq tərəzi; ~ **instrument** həssas / dəqiq cihaz; ~ **ear** həssas qulaq; 5. çətin, zor, zəhmətli, müşkül; ~ **subject** çətin mövzu; ~ **mission** müşkül tapşırıq; ~ **situation** çətin vəziyyət; ~ **stage in negotiations** danışıqlarda çətin mərhələsi; 6. nəzakətli, ədəbli; tərbiyəli, mərifətli, qanacaqlı; ~ **manners** nəzakətli/ədəbli davranış; 7. dadlı, ləzzətli; yüngül; ~ **dish** dadlı/ləzzətli xörək; ~ **food** yüngül yemək

**delicately** ['delıkıtlı] *adv* incə, incəliklə, incədən-incəyə; zərif, gözəl, qəşəng; zövqlə, məharətlə, bacarıqla

**delicateness** [ˌdelıkıtnıs] *n* incəlik, zəriflik

**delicatessen** [ˌdelıkə'tesn] *n* 1. soyuq qəlyanaltı; 2. hazır ərzaq satan mağaza və ya mağazanın bir hissəsi

**delicious** [dı'lıʃəs] *adj* 1. ləzzətli, çox dadlı; ~ **dinner** ləzzətli/çox dadlı nahar; *What a delicious cake! Nə ləzzətli tortdur!* 2. valehedici, heyranedici, məftunedici, çox gözəl, cəzbedici, cazibədar, füsunkar, çox qəşəng; incə, məlahətli; ~ **fragrance** valehedici / füsunkar /cəzbedici rayihə; ~ **joke** incə zarafat

**deliciously** [dı'lıʃəslı] *adv* 1. çox gözəl, füsunkarcasına, füsunkaranə, çox qəşəng; 2. çox ləzzətlə

**delight**[1] [dı'laıt] *n* məftunluq, heyranlıq; sevinc, şadlıq, fərəh; heyran olma / qalma, valeh olma; ləzzət, həzz, zövq; kef, səfa, məmnuniyyət; məmnunluq; razı qalma; **with** ~ məmnuniyyətlə; *I read your new book with delight Mən sənin/sizin yeni kitabını/kitabınızı məmnuniyyətlə oxudum;* **to give** *smb.* ~ bir kəsə zövq /ləzzət vermək; **the ~s of living in the country** kənddə yaşamağın ləzzəti /səfası; *Music is her only delight O ancaq /yalnız musiqidən ləzzət alır;*

◊ **to kick up the devil's** ~, **to raise hell's** ~ şuluqluq etmək, qalmaqal salmaq, azğınlıq etmək, dava salmaq

**delight**[2] [dı'laıt] *v* 1. zövq / ləzzət vermək; valeh / heyran /məftun etmək; nəşə / kef vermək, ruhunu oxşamaq; **to** ~ *smb.* **with** *smth.* bir kəsi bir şeylə valeh/heyran etmək; *He delighted them with his songs O onları mahnıları ilə heyran etdi; Her singing delighted us Onun oxuması bizi məftun / valeh etdi;* **to be ~ed with** *smth.* bir şeyə heyran/valeh olmaq; *I'm delighted to see you Səni / Sizi gördüyümə çox şadam / məmnunam;* 2. ləzzət / zövq / həzz almaq, nəşələnmək; **to** ~ **to do** *smth.* bir şeyi etməkdən həzz/zövq / ləzzət almaq; **to** ~ **in music** musiqidən zövq / həzz almaq; **to** ~ **in praises** tərifdən ləzzət / həzz / zövq almaq

**delighted** [dı'laıtıd] *adj* heyran, məftun; heyran / məftun olmuş; razı, məmnun, xoşhal, sevincli, fərəhli, bəxtiyar, xoşbəxt; **a** ~ **smile** məmnun / razı təbəssüm; **a** ~ **look** fərəhli / sevincli baxış; **a** ~ **child** bəxtiyar / xoşbəxt uşaq

**delightedly** [dı'laıtıdlı] *adv* heyranlıqla, məftunluqla, sevinclə, şövqlə; heyran-heyran, şad, fərəhlə, sevincək, sevinə-sevinə; məmnuniyyətlə

**delightful** [dı'laıtfl] *adj* valehedici, heyranedici, məftunedici, çox gözəl; cazibədar, cəzbedici, füsunkar, çox qəşəng, könülalan; **a** ~ **melody** valehedici / heyranedici / məftunedici melodiya *(hava)*; **a** ~ **holiday** könülaçan/çox gözəl bayram; **a** ~ **companion** çox gözəl yol yoldaşı/həmsöhbət; **a** ~ **book** əyləncəli /maraqlı kitab

**delightfully** [dı'laıtflı] *adv* çox gözəl / qəşəng, füsunkarcasına, füsunkaranə; **to sing** ~ çox gözəl oxumaq *(mahnı)*

**delimit** [di:'lımıt] *v* sərhədini müəyyənləşdirmək *(bir şeyin/yerin)*; hüdud qoymaq, sərhəd çəkmək

**delimitate** [di:'lımıteıt] *v* = **delimit**

**delimitation** [dıˌlımı'teıʃn] *n* 1. müəyyən etmə, təyin etmə/edilmə; sərhədi müəyyənləşdirmə; 2. hədd, sərhəd, hüdud



**delineate** [dı'lınıeıt] *v* 1. çəkmək, cızmaq, çəkib qurtarmaq; çevrəsini cızmaq, dövrəsinə xətt çəkmək, dairəyə almaq; 2. qarasını çəkmək, cızmaq; **to** ~ *one's* **plans** planlarını cızmaq; **to** ~ **the resolution** qətnamənin layihəsinin ümumi formasını cızmaq; 3. təsvir etmək, obrazını *(surətini)* yaratmaq

**delineation** [dıˌlını'eıʃn] *n* 1. çəkmə, cızma; 2. çevrə, kontur; *məc.* ümumi şəkil/təsvir; 3. cizgi, çertyoj; diaqram *(müxtəlif kəmiyyətlər arasındakı nisbəti göstərən qrafik təsvir)*; 4. rəssamlıq təsviri; şəkil, tablo, rəsm; 5. təsvir, təsvir etmə, göstərmə

**delineator** [dı'lınıeıtə'] *n* layihəçi, layihə çəkən mütəxəssis

**delinquency** [dı'lıŋkwənsı] *n* 1. cinayət xarakteri daşıma; cinayət *(xüs. həddi-büluğa çatmayanlar tərəfindən törədilən)*; **infant /juvenile** ~ həddi-büluğa çatmamış uşaqlar arasında cinayət; 2. *hüq.* qanunu pozma, cinayət; **international** ~ beynəlxalq qanun pozuntusu

**delinquent**[1] [dı'lıŋkwənt] *n* qanun pozan, cinayətkar *(xüs. azyaşlılar haq.)*

**delinquent**[2] [dı'lıŋkwənt] *adj* təqsirli, suçlu, müqəssir, günahkar; günah işləyən/ edən *(xüs. azyaşlılar arasında)*; ~ **teenagers** həddi-büluğa çatmamış müqəssirlər / günahkarlar

**delirious** [dı'lırıəs] *adj* 1. sayıqlayan, sayıqlama vəziyyətində olan; **to be** ~ sayıqlamaq; *He is delirious from fever O, qızdırmadan sayıqlayır;* 2. ağılsız, dəli; kütləşmiş, kütləşdirilmiş, küt; 3. sayıqlama, əlaqəsiz, qırıq-qırıq *(nitq haq.)*; 4. *məc.* həyəcanlı; xoşbəxt; ~ **fans** həyəcanlı tərəfdarlar/azarkeşlər

**deliriously** [dı'lırıəslı] *adv* 1. sayıqlama tərzində; 2. dəlicəsinə, vəhşicəsinə; 3. əlaqəsiz, qırıq-qırıq

**deliriousness** [dı'lırıəsnıs] *n* 1. sayıqlama vəziyyəti; kütləşmiş vəziyyət; huşsuzluq, hafizəsizlik, yaddaşsızlıq; 2. rabitəsizlik, əlaqəsizlik *(nitq haq.)*

**delirium** [dı'lırıəm] *n* 1. sayıqlama, sayıqlama vəziyyəti; 2. özündən/haldan çıxma, azğınlaşma, azğınlıq, hiddət, qəzəb; huşsuzluq, hafizəsizlik, yaddaşsızlıq; 3. sayıqlama, sərsəmləmə; hədyan sərsəm fikirlər;

◊ ~ **tremens** alkoqolizm nəticəsində əmələ gələn sayıqlama və qarabasma xəstəliyi

**delist** [dı'list] *v* siyahıdan pozmaq/çıxartmaq

**deliver** [dı'lıvə'] *v* 1. vermək, təhvil vermək, təqdim/təslim etmək; **to** ~ **an order to** *smb.* bir kəsə əmr vermək; **to** ~ **a bill to** *smb.* bir kəsə hesab təqdim etmək; **to** ~ **oneself up to smb.** özünü bir kəsə təslim etmək; **to** ~ *smb.* **into the enemy's hands** bir kəsi düşmənin əlinə vermək; 2. aparıb paylamaq/paylaşdırmaq, çatdırmaq; **to** ~ **letters** məktubları aparıb paylamaq; *Letters are delivered every day Məktubları hər gün gətirib paylayırlar;* 3. oxumaq, söyləmək; **to** ~ **a lecture** mühazirə oxumaq; **to** ~ **a speech** nitq söyləmək; *He delivered his speech effectively O, nitqini çox təsirli söylədi;* 4. təqdim etmək *(hesabat və s.)*; 5. *hüq.* rəsmi olaraq vermək; **to** ~ *smth.* **up / over to** *smb.* bir şeyi rəsmi olaraq bir kəsə vermək, bir kəsin xeyrinə bir şeydən imtina etmək; 6. azad / xilas etmək, qurtarmaq; **to** ~ *smb.* **from captivity** bir kəsi əsirlikdən azad etmək; **to** ~ *smb.* **from death** bir kəsi ölümdən xilas etmək / qurtarmaq; **to** ~ *smb.* **from doing** *smth.* bir kəsi bir şeyi etməkdən azad etmək; 7. doğmaq, hamiləlikdən azad olmaq; **to** ~ **a child** uşaq doğmaq; **to be ~ed of a child** hamiləlikdən azad olmaq; 8. uşaq tutmaq, doğuzdurmaq; *The doctor delivered her baby Həkim onun uşağını tutdu;* 9. təhvil vermək *(qalanı, şəhəri)*; təslim olmaq; **to** ~ *(up)* **a fortress to the enemy** qalanı düşmənə təhvil vermək; 10. *id.* topu ötürmək / vermək; 11. endirmək *(zərbə)*; **to** ~ **a blow** zərbə endirmək / vurmaq; 12. göndərmək; təmin etmək; **to** ~ **by air** hava yolu ilə göndərmək;

◊ **to** ~ **an attack** hücuma başlamaq/ keçmək; **to** ~ **(a) battle** müqavimət göstərmək, qarşısını almaq; **to** ~ **the goods** boynuna götürdüyü öhdəliyi yerinə yetirmək

**deliverance** [dı'lıvərəns] *n* 1. azad / xilas etmə, qurtarma; qurtuluş, xilas, nicat vermə; *Her death was a merciful deliverance from further suffering Onun ölümü ona sonrakı əzabdan qurtarmaq üçün mərhəmət idi;* 2. rəsmi bəyanat/ məlumat

**deliverer** [dı'lıvərə'] *n* 1. xilaskar, xilas edən, xilasedici, qurtarıcı; 2. paylayan *(məktub, qəzet, kitab və s.)*

**delivery**[1] [dı'lıvərı] *n* 1. gətirmə, yetirmə, çatdırma, aparma, aparıb paylama/verilmə; **the early /the first** ~ məktubların səhər/birinci paylanması/gətirilməsi; ~ **of a telegram** teleqramı təqdim etmə; *The next postal delivery is at 2 o'clock Növbəti poçt saat 2-də gətiriləcək;* ~ **of goods** malların gətirilməsi; **to make prompt** ~ tez/dərhal aparmaq *(malı)*; **to pay on** ~ gətirilən malın dəyərini ödəmək; 2. təhvil vermə, təhvil; təslim etmə/ edilmə; tədarük, hazırlıq; **grain deliveries** taxıl tədarükü/hazırlığı, taxıl təhvili; **the** ~ **of a fort/a town** istehkamı/şəhəri təhvil vermə; *The delivery of our town to the enemy was a great shock to us all Şəhərimizin düşmənə təhvil verilməsi bizim hamımız üçün ağır zərbə idi;* 3. doğuş, doğma, doğum; **an easy/a difficult** ~ asan/çətin doğuş; **artificial** ~ süni doğuş/ doğma; ~ **of a child** uşağın doğulması, uşaq doğma; *The child had an easy delivery Uşaq asanlıqla doğuldu; The mother had an easy delivery Ana asanlıqla doğdu;* 4. *teatr.* ifa tərzi/etmə tərzi; **the actor's poor** ~ aktyo-

run pis danışıq tərzi /danışığı/diksiyası *(tələffüzün, ifadənin aydın olmaması)*

**delivery²** [dı'lıvərı] *adj* paylayan, aparan; **a ~ boy** paylayan *(məktubu və s.)* oğlan; **a ~ note** faktura *(malla bərabər göndərilən və mal alan tərəfindən imza edilən sənəd)*; **~ desk** evə kitab verilən stol *(kitabxanada)*; **~ truck** aparan/ çatdıran maşın *(poçtu və ya ərzağı)*; **~ pipe** təzyiq borusu; **~ pump** *tex.* basma nasos

**dell** [del] *n* I dərə *(ətrafında ağac olan)*

**dell** [del] *n* II *arx.* qız

**delphinium** [del'fınıəm] *n bot.* mahmızçiçəyi

**delta** ['deltə] *n* 1. yunan əlifbasının dördüncü hərfi; 2. *coğ.* delta *(çayın dənizə töküldüyü yerdə əmələ gətirdiyi qollar)*; **the Nile Delta** Nil çayının deltası

**delude** [dı'lu:d] *v* çaşdırmaq, aldatmaq; **to ~ oneself** aldanmaq, çaşmaq, özünü aldatmaq; *You are deluding yourself if you think things will get better Məsələlərin daha yaxşı olacağını fikirləşirsənsə/ fikirləşirsinizsə, sən/siz özünü / özünüzü aldadırsan/aldadırsınız;* **to ~ smb.** bir kəsi aldatmaq/çaşdırmaq; **to ~ smb. with empty promises** bir kəsi boş vədlərlə aldatmaq

**deluge¹** ['delju:dʒ] *n* 1. daşqın, sel; **the Deluge** *bibl.* ümumdünya daşqını/seli; *When the snow melts, the mountain streams becomes a deluge Qar əriyəndə kiçik dağ çayları selə dönür;* 2. bərk yağış, leysan; *You'll be wet through in that deluge Bu leysanda sən/siz tamam islanacaqsan/islanacaqsınız;* 3. *məc.* axın, sel; **~ of words** söz axını; **~ of letters** məktub seli / axını; **~ of questions** suala basma; **~ of criticism** tənqidə basma

**deluge²** ['delju:dʒ] *v* 1. *məc. (Adətən məchulda işlənir):* basmaq, yağdırmaq *(sual və s.)*; *The minister was deluged with questions Nazirin üstünə / başına suallar yağdırdılar; I was deluged with phone calls Telefon zəngləri başıma yağdı; We advertised the job and were deluged with applications Biz iş haqqında elan verdik və ərizələr yağış kimi başımıza yağdı;* 2. basmaq, daşıb basmaq *(su, sel)*

**delusion** [dı'lu:ʒn] *n* 1. aldatma, aldanma; yalan, hiylə, kələk, fırıldaq; 2. yanılma, yanlış fikir; illüziya; xəyal, xülya; **to labour / to be under a ~** aldanmaq; 3. *tib.* maniya *(bir şeyə, bir fikrə həddindən artıq mübtəla olmaqdan ibarət ruhi xəstəlik)*; mübtəlalıq, düşkünlük; **~ (s) of grandeur** allahlıq iddiası; 4. hallüsinasiya; qarabasma, gözəgörünmə; sayıqlama, sərsəmləmə

**delusionist** [dı'lu:ʒənıst] *n* 1. yalançı, adamaldadan; 2. xəyalpərəst, xülyaçı

**delusive** [dı'lu:sıv] *adj* 1. aldadıcı; saxta, yalançı; **~ appearance** aldadıcı *(xarici)* görkəm; **~ promises** yalançı vədlər; **~ impression** aldadıcı təəssürat; 2. xəyali, başagəlməz; qeyri-real; **~ hopes** xam xəyallar

**delusiveness** [dı'lu:sıvnıs] *n* 1. aldadıcılıq; saxtalıq, yalançılıq; 2. xəyalilik, qeyri-dəqiqlik, qeyri-reallıq, xam xəyallıq

**de luxe¹** [də'luks] *adj fr.* dəbdəbəli, təmtəraqlı, cah-calallı, lüks; **~ hotel** dəbdəbəli/təmtəraqlı/cah-calallı/lüks hotel; **~ car** çox gözəl maşın; **~ edition** çox nəfis nəşr

**de luxe²** [də'luks] *adv* çox qəşəng / gözəl, təmtəraqlı, dəbdəbəli, calallı, parlaq, lüks

**delve¹** [delv] *n* 1. çökək, çökək yer, çökəklik; təkər yeri / izi, oyum, oyuq, çuxur; 2. qazma, qazılma, qazıntı

**delve²** [delv] *v* 1. qapılmaq *(fikrə, xəyala)*, dərindən öyrənmək *(bir şeyi)*; *məc.* axtarmaq, araşdırmaq, əlləşmək; **to ~ into documents** sənədləri araşdırmaq, sənədlərin içində eşələnmək /əlləşmək; **to ~ into old books** köhnə kitabların içində eşələnmək; **to ~ into history** tarixi öyrənməyə aludə olmaq, tarixi axtarışlar aparmaq; 2. axtarmaq; *She delved in her bag for a pen O, çantasında qələm axtardı*

**demagog** ['deməgɔg] *n* = **demagogue**

**demagogic** [.demə'gɔgık] *adj* demaqoq

**demagogical** [.demə'gɔgıkəl] *adj* = **demagogic**

**demagogism** ['deməgɔgızm] *n* demaqoqiya, demaqoqluq

**demagogue** ['deməgɔg] *n* demaqoq

**demagogy** ['deməgɔgı] *n* = **demagogism**

**demand¹** [dı'ma:nd] *n* 1. tələb etmə, tələb; **public ~** ictimaiyyətin tələbi; **to meet / to satisfy smb.'s ~s** bir kəsin tələblərini təmin etmək/yerinə yetirmək; *It's impossible to satisfy all their demands Onların bütün tələblərini yerinə yetirmək qeyri-mümkündür; The workers' demands for higher pay were refused / rejected by the employers Fəhlələrin daha yüksək əmək haqqı almaq barədə tələbləri sahibkarlar tərəfindən rədd edildi;* 2. ehtiyac, tələb, tələbat; **immediate ~s** bilavasitə ehtiyaclar; 3. *siya. iq.* tələb; **~ and supply, supply and ~** təklif və tələb; **poor ~** az tələbat; **great /strong ~** böyük tələbat; **~ for consumer goods** istehlak mallarına tələbat; **to be in *(great)* ~** böyük tələbat olmaq; 4. *hüq.* iddia, tələbnamə, tələb; **to hold a ~ against *smb.*** bir kəsə qarşı iddia qaldırmaq;

◊ **to have many ~s on *one's* purse** çoxlu xərci olmaq; **to have many ~s on *one's* time** çox işigücü olmaq; həmişə məşğul olmaq

**demand²** [dı'ma:nd] *v* 1. tələb etmək, istəmək, tələb irəli sürmək; qətiyyətlə tələb etmək / istəmək; **to ~ an apology** üzr istəməyi tələb etmək; **to ~ an immediate answer** dərhal cavab tələb etmək; **to ~ satisfaction** 1) üzr istəməyi tələb etmək; 2) duelə çağırmaq; **to ~ *smth.* of / from *smb.*** bir kəsdən bir şeyi tələb etmək; *I demand to see everything Mən tələb edirəm ki, hər şeyi mənə göstərsinlər;* 2. ehtiyacı olmaq; tələb etmək; *The operation demands great care Cərrahiyyə əməliyyatı çox böyük diqqət tələb edir; The case demands skill and energy Bu iş məharət və güc tələb edir; This kind of work demands great patience Bu növ iş böyük dözüm / hövsələ tələb edir;* 3. *hüq.* mülk /əmlak haqqında rəsmi tələb təqdim etmək *(əmlakın hüquqi sahibi kimi)*

**demandant** [dı'ma:ndənt] *n hüq.* iddiaçı

**demanding** [dı'ma:ndıŋ] *adj* tələbkar, çox qayğıkeş; **a ~ father / mother** tələbkar ata / ana

**demarcate** ['di:ma:keıt] *v* 1. demarkasiya xətti çəkmək; **to ~ the frontier of a country** ölkənin sərhədini müəyyənləşdirmək; 2. fərqləndirmək, ayırmaq; **to ~ one dialect from another** bir dialekti o birindən fərqləndirmək; *The playing area is demarcated by a white line Oyun meydanı ağ xətt vasitəsilə ayrılıb*

**demarcation** [.di:ma:'keıʃn] *n* 1. demarkasiya *(sərhəd çəkilməsi, sərhəd təyin edilməsi)*; **line of ~** demarkasiya xətti; 2. sərhəd çəkmə, hədd qoyma; ayırma

**demarcative** [dı:'ma:kətıv] *adj* 1. demarkasiya; 2. ayırıcı, ayıran; sərhəd qoyan

**demean** [dı'mi:n] *v* alçaltmaq, hörmətdən salmaq, təhqir etmək; **to ~ oneself** özünü hörmətdən salmaq, öz ləyaqətini alçaltmaq; *He demeaned himself by taking the bribe Rüşvət almaqla o özünü hörmətdən saldı*

**demeaning** [dı'mi:nıŋ] *adj* ləyaqətini alçaldan; hörmətdən salan; *He found it very demeaning to have to work for his former employee O, əvvəlki qulluqçusunun əlinin altında işləməsini özü üçün həqarət hesab etdi*

**demeanor** [dı'mi:nə^r] *n amer* = **demeanour**

**demeanour** [dı'mi:nə^r] *n* əxlaq, rəftar, davranış, hərəkət tərzi, özünü aparma; *His demeanour has always been that of a perfect gentleman Onun davranışı həmişə əsl centlmenin davranışı olub*

**demented** [dı'mentıd] *adj* dəli, ağılsız, kəmağıl; **to become ~** dəli olmaq, ağlını itirmək; *It will drive me demented Bu məni dəli edəcək; When her child was two hours late, she became quite demented Uşağı iki saat gecikəndə, o lap dəli olurdu*

**dementedly** [dı'mentıdlı] *adv* dəli kimi, dəlicəsinə; çox əsəbi və narahat

**dementia** [dı'menʃıə] *n tib.* 1. ağıldankəmlik, kəmağıllıq, ağıl zəifliyi; huşsuzluq; **senile ~** qocalıq huşsuzluğu / kəmağıllığı; 2. dəlilik

**demerit** [di:'merıt] *n* nöqsan, qüsur; eyib; **merits and ~s of a system** sistemin məziyyətləri və qüsurları

**demilitarization, - sation** [.di:mılıtəraı'zeıʃn] *n* demilitarizasiya, silahsızlaşdırma *(bir dövlətə qoşun saxlamağı, hərbi sənaye yaratmağı, istehkamlar düzəltməyi qadağan etmə)*

**demilitarize, - ise** ['di:'mılıtəraız] *v* demilitarizasiya etmək, silahsızlaşdırmaq



**demi-rep** ['demırep] *n* əxlaqı şübhəli / ayağı sürüşkən qadın

**demise¹** [dı'maız] *n* 1. *hüq.* daşınmaz əmlakın vəsiyyətə əsasən başqasına verilməsi; 2. *hüq.* daşınmaz əmlakın arendaya verilməsi; 3. taxt-tacın/hakimiyyətin vəliəhdə keçməsi; 4. ölüm, vəfat *(etmə)*; **premature ~** vaxtsız ölüm; 5. süqut etmə, məhv olma; **the ~ of the communist regime** kommunist rejiminin süqut etməsi / süqutu

**demise²** [dı'maız] *v* 1. *hüq.* əmlakı / mülkü vəsiyyət etmək *(bir kəsə)*; əmlakı /mülkü varisliyə görə vermək; *The property demised to the heir Əmlak/Var-dövlət varisə keçdi;* 2. arendaya vermək; 3. hakimiyyətdən əl çəkmək, hakimiyyəti başqasına vermək; **to ~ the crown** taxt-tacı varisə/vəliəhdə vermək; 4. iflas etmək, iflasa uğramaq, süqut etmək; ölmək, məhv olmaq *(nəzəriyyə, müəssisə və s. haq.)*

**demit** [dı'mıt] *v* vəzifədən əl çəkmək / imtina etmək, istefaya getmək; əl çəkmək *(hüquqdan, haqqından)*

**demobilisation** ['di:.moubılaı'zeıʃn] *n* = **demobilization**

**demobilization** ['di:.moubılaı'zeıʃn] *n* demobilizasiya, tərxis *(hərbi qüvvələrin qulluqdan azad edilməsi)*

**demobilize, - ise** [di:'moubılaız] *v* demobilizasiya / tərxis etmək, ordudan buraxmaq

**democracy** [dı'mɔkrəsı] *n* 1. demokratiya; 2. demokratizm *(demokratiyanın həyata keçirilməsi)*; 2. demokratik ölkələr; **the Western democracies** qərbin demokratik ölkələri

**democrat** ['deməkræt] *n* 1. demokrat; 2. *amer.* *(D)* demokrat partiyasının üzvü *(Amerikada)*

**democratic** [.demə'krætık] *adj* demokratik; **~ institutions** demokratik idarələr; **~ rights** demokratik hüquqlar; **~ election** demokratik seçki; **~ government** demokratik hökumət; **~ rule** demokratik qayda; **~ society** demokratik cəmiyyət; **~ outlook** demokratik baxış

**democratically** [.demə'krætıkəlı] *adv* demokratik surətdə / olaraq

**democratism** [dı'mɔkrətızm] *n* demokratizm *(demokratiyanın həyata keçirilməsi)*

**democratization, - sation** [dı.mɔkrətaı'zeıʃn] *n* demokratlaşdırma, demokratlaşdırılma, demokratlaşma

**democratize, -ise** [dı'mɔkrətaız] *v* demokratlaşdırmaq, demokratlaşmaq

**demographic** [.demə'græfık] *adj* demoqrafik

**demography** [di:'mɔgrəfı] *n* demoqrafiya *(statistikada əhalinin tərkibini, sayını və onun tərkibindəki dəyişiklikləri öyrənən şöbə)*

**demolish** [dı'mɔlıʃ] *v* 1. dağıtmaq, yıxmaq, uçurmaq; **to ~ a building** binanı uçurmaq/dağıtmaq; *They're going to demolish that old building and put up a new one Onlar o köhnə binanı uçur-*

*maq və yerində yenisini tikmək fikrindədirlər;* 2. təkzib etmək, yalan olduğunu sübut etmək, yalana çıxartmaq; **to ~ arguments** dəlilləri/sübutları təkzib etmək; *We've demolished all her arguments and she has nothing more to say Biz onun bütün dəlillərini təkzib etmişik və onun deməyə artıq bir şeyi yoxdur;* 3. *zaraf.* acgözlüklə yemək; **to ~ two big platefuls of chicken** iki böyük boşqab dolusu toyuq ətini acgözlüklə ötürmək / yemək

**demolition** [ˌdemə'lɪʃn] *n* 1. dağıtma, uçurma, viran etmə, yıxma; dağılma, uçulma, viran olma, məhv/yox etmə; sökmə, sökülmə; 2. *pl* xarabalıq, viranəlik, xarabazar, xarabazarlıq; 3. pozma, pozulma, məhv / yox etmə, ləğv etmə / edilmə; **the ~ of rights** hüquqların ləğv edilməsi

**demon** ['dɪ:mən] *n* 1. iblis, şeytan; yoldan / başdan çıxaran, tovlayan *(adam);* 2. qəddar / bədrəftar adam; *Your son's a little demon Sənin/Sizin oğlun/oğlunuz balaca şeytandır;* 3. *enerjili, işgüzar; She's a demon for work O, çox işgüzardır*

**demoniac** [dɪ'mounɪæk] *adj* 1. mübtəla, tutulmuş; **~ possession** mübtəlalıq, mübtəla olma; dəli, cinli; 2. şeytan, iblisanə, məkrli; **~ laughter** iblisanə / məkrli qəhqəhə / gülüş;

**demonic** [dɪ:'mɔnɪk] *adj* 1. məkrli; hiyləgər, iblisanə; 2. qeyri-adi, istedadlı / zəkalı / qabiliyyətli, fövqəlbəşər bacarığa/qabiliyyətə / istedada malik olan

**demonism** ['dɪ:mənɪzm] *n* iblisə / şeytana səcdə etmə

**demonology** [ˌdɪ:mə'nɔlədʒɪ] *n* demonologiya *(ibtidai insanların cinlərə inanması)*

**demonopolize** [ˌdɪ:mə'nɔpəlaɪz] *v* monopoliyanı ləğv etmək / dağıtmaq

**demonstrability** [ˌdemənstrə'bɪlɪtɪ] *n* 1. sübut oluna bilmə, sübut olunma imkanı; 2. *arx.* aydınlıq, aşkarlıq, şübhəsizlik; əyanilik

**demonstrable** ['demənstrəbl] *adj* 1. sübut oluna bilən; **~ proposition** sübut oluna bilən fikir / müddəa; 2. *arx.* aydın, aşkar, şübhəsiz, göz qabağında olan; **a ~ lie** aydın/aşkar yalan; **a ~ truth** aydın / aşkar həqiqət; *There is no demonstrable link between the two events Bu iki hadisə arasında açıq-aydın heç bir əlaqə yoxdur*

**demonstrably** ['demənstrəblɪ] *adv* açıq-aydın, əyani surətdə, aşkar, inandırıcı *(surətdə)*

**demonstrate** ['demənstreɪt] *v* 1. nümayiş etdirmək, göstərmək; *Please demonstrate how the machine works Zəhmət olmasa, göstərin/nümayiş etdirin görək maşın necə işləyir;* 2. göstərmək, aşkar etmək, əyani olaraq göstərmək; **to ~ one's valour** öz cəsarətini/kişiliyini göstərmək; **to ~ one's feelings** hisslərini açıb göstərmək; 3. sübut etmək; **to ~ proposition** fikri/ müddəanı sübut etmək; *She demonstrated that 2 and 2 are 4 O, sübut etdi ki, 2 dəfə 2 dörd edir;* 4. nümayişdə iştirak etmək; nümayişə çıxmaq; **to ~ against smth.** bir şeyə qarşı nümayişdə iştirak etmək, bir şeyə qarşı etiraz etmək

**demonstration** [ˌdeməns'treɪʃn] *n* 1. nümayiş; **a mass ~** kütləvi nümayiş; **May day ~** bir may nümayişi; **to make a ~** nümayiş təşkil etmək; **to take part in / to go on a student ~** tələbə nümayişində/ tələbələrin təşkil etdiyi nümayişdə iştirak etmək; 2. göstərmə, nümayiş etdirmə; **armed / military ~** hərbi nümayiş, hərbi qüvvəni nümayiş etdirmə; 3. əyani göstərmə; **to teach by visual / ocular ~** əyanilik metodu ilə tədris etmək / öyrətmək; *She gave us a brief demonstration of the computer's functions O, kompüterin işini əyani olaraq yığcam şəkildə bizə göstərdi;* 4. üzə çıxma, büruzə vermə *(hiss və s.);* **to give a ~ of one's intentions** öz niyyətini büruzə vermək; **to dislike ~ of feelings** öz hisslərini büruzə verməyi xoşlamamaq; **~s of love** məhəbbətin / eşqin nişanələri; 5. sübut; əsaslandırma, dəlil gətirmə, sübut göstərmə; **indirect ~** bilavasitə sübut; 6. şəhadət; sübut, dəlil; **to seek for a ~ of smb.'s guilt** bir kəsin günahı haqqında dəlil / sübut axtarmaq

**demonstrative** [dɪ'mɔnstrətɪv] *adj* 1. əyani; nümunəvi; **~ example** əyani misal; **~ farm** nümunəvi ferma; 2. sübutedici; sübutlu; əsaslı, qaneedici, inandırıcı; **~ of his skill** onun ustalığını göstərən; 3. sübut oluna bilən; **readily ~** asanlıqla sübut edilə bilən; 4. *qram.* işarə; **~ pronoun** işarə əvəzliyi; *This and that are demonstrative pronouns This və that işarə əvəzlikləridir*

**demonstratively** [dɪ'mɔnstrətɪvlɪ] *adv* 1. inandırıcı / əsaslı bir surətdə; şübhəsiz; sübutlu, inandırıcı; **to prove / to show smth. ~** bir şeyi əsaslı tərzdə sübut etmək; 2. coşğunluqla, həyəcanla, qızğın surətdə

**demonstrativeness** [dɪ'mɔnstrətɪvnɪs] *n* aydınlıq, aşkarlıq, şübhəsizlik; əyanilik, inandırıcılıq

**demonstrator** ['demənstreɪtə'] *n* 1. nümayiş iştirakçısı, nümayişdə iştirak edən, nümayişçi; *The demonstrators were dispersed by the police Polislər nümayişçiləri dağıtdı;* 2. göstərən, nümayiş etdirən *(şəxs)*

**demoralization, - sation** [dɪˌmɔrəlaɪ'zeɪʃn] *n* pozğunluq, pozulma, mənəvi pozğunluq

**demoralize, - ise** [dɪ'mɔrəlaɪz] *v* 1. pozğunluq salmaq, pozğunlaşdırmaq, mənəviyyatını / əxlaqını pozmaq, yoldan çıxartmaq, pis yola çəkmək; 2. intizamsızlıq salmaq/törətmək, intizamı/nizamı/qaydanı pozmaq; **to ~ an army** ordunun mənəviyyatını pozmaq, orduya pozğunluq salmaq

**demote** [dɪ'mout] *v* vəzifəsini/rütbəsini aşağı salmaq; vəzifədən çıxartmaq; *He was demoted from sergeant to corporal Onun rütbəsini serjantlıqdan yefreytora endirdilər*

**demotic** [dɪ'moutɪk] *adj* xalq, xalqın ruhuna / dünyagörüşünə uyğun



**demotion** [dɪ'mouʃn] *n* vəzifədə / rütbədə aşağı endirmə; vəzifədən çıxarma

**demount** [dɪ'maunt] *v* sökmək; **to ~ a motor** motoru sökmək

**demountable** [dɪ'mauntəbl] *adj* sökülə bilən; çıxarıla bilən, çıxarılıb taxılan; **~ rim** çıxarılıb taxılan çənbər/sağanaq *(avtomobil təkərində və s.)*

**demulcent**[1] [di:'mʌlsənt] *n tib.* ağrıkəsən / sakitləşdirici dərman

**demulcent**[2] [di:'mʌlsənt] *adj tib.* ağrıkəsən, yüngülləşdirən, sakitləşdirən *(ağrını)*

**demur**[1] [dɪ'mə:'] *n* etiraz, protest; **without ~** etirazsız, etiraz etmədən; *They accepted my proposal without demur Onlar mənim təklifimi etirazsız qəbul etdilər; No demur Etiraz yoxdur*

**demur**[2] [dɪ'mə:'] *v* (-rr-) etiraz /protest etmək; **to ~ to / at the inference** nəticəyə etiraz etmək, nəticənin əleyhinə çıxmaq; *I suggested putting the matter to a vote, but the chairman demurred Mən məsələni səsə qoymağı təklif etdim, lakin sədr etiraz etdi*

**demure** [dɪ'mjuə] *adj* 1. təvazökar; tərbiyəli; ədəbli, dinc, sadə; ciddi, təmkinli; **~ conduct** ədəbli davranış; **a ~ reply** ədəbli / ciddi cavab; **a ~ smile** tərbiyəli / ədəbli təbəssüm; **a very ~ young lady** təvazökar / ədəbli gənc xanım; 2. süni / zahirən təmkinli / təvazökar

**demurely** [dɪ'mjuəlɪ] *adv* 1. təvazölə, təvazökarlıqla; sadə, adi; ciddi; təmkinlə, səbrlə, ehtiyatla; 2. yalançı təvazökarlıqla

**demureness** [dɪ'mjuənɪs] *n* 1. təvazö, təvazökarlıq; 2. sakitlik, utancaqlıq, sadəlik; 3. ciddilik, ciddiyyət; təmkinlilik; 4. yalançı təvazö / təvazökarlıq

**demystify** [ˌdi:'mɪstɪfaɪ] *v (pt, pp* **-fied**) aydınlaşdırmaq, aydın etmək, asanlaşdırmaq; *We are trying to demystify the workings of government Biz hökumətin işlərini aydınlaşdırmağa çalışırıq*

**demystification** [ˌdi:ˌmɪstɪfɪ'keɪʃn] *n* aydınlaşdırma, asanlaşdırma

**den**[1] [den] *n* 1. yuva, yataq, ayı yuvası; **fox's / bear's /lion's ~** tülkü /ayı /şir yuvası; 2. vəhşi heyvanlar üçün qəfəs *(heyvanxanada);* 3. mağara, kaha; **a ~ of thieves** oğruların məskəni/yuvası; 4. sığınacaq; 5. qumarxana, tiryəkxana, yuva; **robber ~** oğurluq məskəni, oğru yuvası; **~ of vice** fahişəxana; 6. balaca/darısqal otaq, hücrə, otaqcıq; 7. *d.d.* rahat iş otağı, kabinet

**den**[2] [den] *v* 1. yuvada yaşamaq, qışı yuvada keçirmək, yuvada qışlamaq; 2. yuvada / mağarada / kahada gizlənmək

**denationalisation, - sation** ['dɪ:ˌnæʃnəlaɪ'zeɪʃn] *n* 1. milliləşdirməni ləğv etmə, milliləşdirilmiş əmlakı əvvəlki sahibinə qaytarma; 2. milli xüsusiyyətlərini itirmə

**denationalize, - ise** [di:'næʃnəlaɪz] *v* 1. milliləşdirilmiş mülkləri əvvəlki sahiblərinə qaytarmaq; 2. milli hüquqları əlindən almaq, milli hüquqlardan məhrum etmək, milli xüsusiyyətlərdən məhrum etmək

**denial** [dɪ'naɪəl] *n* 1. inkar etmə, danma, inkar; təkzib etmə/edilmə; yalana çıxartma; təkzib; etiraz; rədd etmə/edilmə; **sweeping ~** əsassız təkzib etmə/təkzib; **to issue a flat / strong ~** qəti təkzib dərc etmək; **to meet the charge with a flat ~** ittihamı qəti rədd etmək; **to make a ~** təkzib etmə; **~ of facts** dəlilləri/sübutları təkzib etmə; 2. *hüq.* günahı/suçu rədd /inkar etmək, cinayətdə iştirakını inkar etmə; **~ of a fault/of one's guilt** günahkar olduğunu inkar etmə; 3. rədd etmə/ edilmə; boyun qaçırma, imtina etmə; **~ of smb.'s request** bir kəsin xahişini yerinə yetirməkdən imtina etmə; **~ of passports** pasport verməkdən imtina etmə; 4. üz döndərmə, dönmə, əl çəkmə; **the ~ of one's family** ailəsindən üz döndərmə; **~ of a faith** etiqaddan/dindən üz döndərmə; 5. fədakarlıq; varından-yoxundan keçmə, özünü hər şeydən məhrum etmə; qənaət etmə, öz tələbatını məhdudlaşdırma

**denigrate** ['denɪgreɪt] *v* 1. ləkələmək, qara yaxmaq, bədnam / biabır etmək, böhtan atmaq; 2. böhtan /şər atmaq, iftira etmək; kölgə salmaq; **to ~ smb.'s achievement** bir kəsin nailiyyətinə kölgə salmaq

**denigration** [ˌdenɪ'greɪʃn] *n* 1. ləkələmə, qara yaxma, bədnam /biabır etmə; 2. böhtan /şər atma, iftira etmə, böhtan, şər

**denigrator** ['denɪgreɪtə'] *n* böhtançı, iftiraçı, şərxata, şər atan

**denim** ['denɪm] *n* adətən göy rəngdə qalın pambıq parça *(iş paltarı tikmək üçün)*

**denizen**[1] ['denɪzn] *n* 1. sakin; əhl, yaşayan; **~s of the frost** meşədə yaşayanlar, ağaclar; **~s of the air** havada yaşayanlar; 2. xüsusi bir yerdə/məkanda yaşayan heyvan; **polar bears, ~s of the frozen north** qütb ayıları, şaxtalı şimalın sakinləri; 3. yerli şəraitə uyğunlaşmış əcnəbi / heyvan

**denizen**[2] ['denɪzn] *v* əcnəbilərə vətəndaşlıq hüququ vermək

**denominate** [dɪ'nɔmɪneɪt] *v* 1. adlandırmaq, ad qoymaq/vermək; 2. ifadə etmək, göstərmək, demək, izhar etmək

**denomination** [dɪˌnɔmɪ'neɪʃn] *n* 1. adlandırma, ad vermə / qoyma, adlanma; 2. işarə, əlamət, nişan göstərmə, işarə / qeyd etmə; 3. ad; **known under the ~ of ...** ...adı altında tanınan; 4. dəyər, qiymət; **of the same ~** eyni dəyərə / qiymətə malik; **coins of small ~** az dəyəri olan xırda / dəmir pullar; 5. məzhəb; *Among Christians there are many denominations Xristianlar arasında çoxlu məzhəblər var*

**denominational** [dɪˌnɔmɪ'neɪʃnl] *adj* müəyyən bir məzhəbə aid olan; **~ school** eyni məzhəbə məxsus şagirdlər oxuyan məktəb

**denominator** [dı'nɔmıneıtə^r] *n riyaz.* məxrəc; **to find a common** ~ ümumi məxrəc tapmaq; **to reduce to a common** ~ ümumi məxrəcə gətirmək
**denotation** [,di:nou'teıʃn] *n* **1.** qeyd etmə, göstərmə, işarə etmə, nişanlama; **2.** işarə, əlamət, nişan; ad
**denote** [dı'nout] *v* **1.** göstərmək, işarə etmək, nişan vermək; qeyd etmək; **to** ~ **the hour** saatı *(vaxtı)* göstərmək; ~ **an approaching storm** yaxınlaşan tufanı göstərmək / xəbər vermək; **2.** bildirmək, ifadə etmək; *In algebra, the sign* **x** *usually denotes an unknown quantity Cəbrdə* **x** *işarəsi adətən qeyri-müəyyən miqdar bildirir / ifadə edir; What does this term denote? Bu termin nə ifadə edir / bildirir?*
**denouement** [deı'nu:ma:ŋ] *n fr.* **1.** açma, açılma; **2.** *məc.* aydınlaşma, aydınlaşdırma; **3.** son, nəticə, xitam *(kitabın, pyesin və s. hər şeyi aşkarlayan son hissəsi)*
**denounce** [dı'nauns] *v* **1.** pisləmək, bəyənməmək, məzəmmət etmək, qınamaq; *The minister's action was denounced in the newspaper Nazirin fəaliyyəti qəzetdə pislənmişdi;* **2.** təqsirləndirmək, müqəssir /məhkum etmək, müttəhim hesab etmək; ittiham etmək; **to** ~ *smb.* **for theft** bir kəsi oğurluqda ittiham etmək /təqsirləndirmək; **3.** ifşa etmək; **to** ~ *smb.* **as an impostor** bir kəsi yalançı kimi ifşa etmək; **4.** ləğv etmək, etibarsız elan etmək *(müqaviləni və s.);* **to** ~ **a treaty** müqaviləni ləğv etmək; **5.** xəbərdarlıq etmək, qabaqcadan xəbər vermək *(təhlükə və s. haq); They are denounced to the authorities as counter-revolutionaries Onların əksinqilabçı olmaları haqqında hökumət adamlarına xəbər verilmişdi*
**dense** [dens] *adj* **1.** qatı; ~ **fog** qatı duman; **2.** sıx, qalın; ~ **forest** sıx / qalın meşə; ~ **trees** sıx ağaclar; ~ **traffic** sıx küçə hərəkəti; **3.** ifrat; tam, tamam; ~ **stupidity** tam axmaqlıq / giclik /anlamazlıq/qanmazlıq/ sarsaqlıq; ~ **ignorance** tam avamlıq; **4.** küt, sarsaq, ağılsız; qanmaz, başıboş; ~ **head** gic/boş/ağılsız baş; ~ **fellow** tamamilə gic / qanmaz cavan
**densely** ['densli] *adv* sıx, qatı; ~ **populated country** əhalisi sıx olan ölkə; ~ **wooded** sıx ağaclı
**denseness** ['densnıs] *n* = **density** *(1, 2-ci mənalarda)*
**density** ['densətı] *n* **1.** sıxlıq, qalınlıq; **mean** ~ orta sıxlıq; **unit of** ~ sıxlıq vahidi; ~ **of the air** havanın sıxlığı; ~ **of the population** əhalinin sıxlığı; ~ **of fire** atəşin sıxlığı *(top atəşi);* **2.** tam giclik / axmaqlıq; **3.** *fiz.* xüsusi çəki
**dent**[1] [dent] *n* I oyuq, çuxur, çökək *(yer),* çala; batıq; əzik, batıq yer; *His bike hit the side of my car and made quite a dent in it Onun velosipedi mənim maşınıma dəydi və onda əməlli-başlı batıq əmələ gətirdi*
**dent** [dent] *n* II **1.** *tex.* diş *(mişarda, darağda, çarxda və s.);* **2.** kərtik, çərtmə, kərtmə; dişəmə, diş açma
**dent**[2] [dent] *v* I **1.** içəri basmaq; batırmaq; çökdürmək; tıxamaq, dürtmək; əzmək; *The back of the car was badly dented in a collision Toqquşmada maşının dalı bərk əzildi;* **2.** deşik-deşik/dəlik-dəlik etmək; **to** ~ *smth.* **with bullets** bir şeyi güllə ilə dəlik-dəlik/deşik-deşik etmək; **3.** basılmaq, batmaq *(təzyiqdən),* basılmaq, tıxanmaq
**dent** [dent] *v* II **1.** kəsmək, kərtmək, çərtmək, açmaq *(kərtik, nişan);* diş-diş etmək, diş açmaq, dişəmək *(mişarı və s.);* **2.** batmaq, sancılmaq *(bir şeyə);* **3.** dişənmək; diş-diş edilmək
**dental** ['dentl] *adj* **1.** diş; ~ **surgeon** diş həkimi; ~ **decay** diş çürüməsi; ~ **health** diş sağlamlığı; ~ **treatment** diş müalicəsi; ~ **nerve** diş əsəbi; ~ **cavity** diş boşluğu; **2.** diş həkimliyi; ~ **school** diş həkimliyi məktəbi; ~ **drill** dişyonan maşın, bormaşın *(diş həkimlərinin işlətdiyi burğu maşını);* **3.** *fon.* diş, dental *(səslər haq.)*
**dented** ['dentıd] *adj* diş-diş edilmiş, diş / kərt açılmış; kələ-kötür
**dentist** ['dentıst] *n* diş həkimi, dentist
**dentistry** ['dentıstrı] *n* **1.** diş müalicəsi; **2.** diş həkiminin peşəsi / sənəti
**dentition** [den'tıʃən] *n* **1.** dişin çıxması/inkişaf etməsi/böyüməsi; **2.** dişlərin düzülməsi; **3.** *top.i* dişlər *(insanda və heyvanda)*
**denture** ['dentʃə^r] *n* diş protezi; **a set of** ~ bir dəst süni diş
**denuclearized** [dı:'nju:klıəraızd] *adj* nüvə silahı olmayan; ~ **zone** nüvə silahı olmayan zona
**denudate**[1] [dı'nju:dıt] *adj* çılpaq, lüt; ~ **trees** çılpaq ağaclar
**denudate**[2] [dı'nju:deıt] *v* = **denude**
**denude** [dı'nju:d] *v* açmaq; soyundurmaq, lüt /çılpaq etmək; çılpaqlaşdırmaq; üryan etmək; **to** ~ *smb.* **of clothing** bir kəsin paltarını soyundurmaq; **trees ~d of leaves** çılpaqlaşmış ağaclar; **hillsides ~d of trees** çılpaq təpələr *(ağacı olmayan)*
**denunciation** [dı,nʌnsı'eıʃn] *n* hökm; ittihamnamə; təqsirnamə; ifşa etmə/edilmə; ifşa; **her fierce** ~ **of her enemies** onun düşmənlərini amansızlıqla ifşa etməsi; **the** ~ **of evil** şərin ifşası
**denunciator** [dı'nʌnsıeıtə^r] *n* **1.** ittihamçı, ifşaçı, ifşa edən *(adam);* **2.** *hüq.* donosçu, xəbərçi, çuğul, çuğulçu
**denunciatory** [dı'nʌnsıətərı] *adj* **1.** ittihamedici; ifşaedici; **2.** hədəli, hədə, təhlükəli, təhlükə bildirən
**deny** [dı'naı] *v* (*pt, pp* **denied**) **1.** danmaq, inkar etmək; rədd etmək, qəbul etməmək; *The government denies responsibility for disaster Hökumət fəlakətin nəticələri üçün cavabdehliyi öz üzərinə götürmür;* **to** ~ **a claim** tələbi rədd etmək; **to** ~ **the possibility of** *smth.* bir şeyin mümkünlüyünü inkar etmək; **to** ~ **a theory** nəzəriyyəni qəbul etməmək; **to** ~ **a rumour** şayiəni rədd/inkar etmək; **to** ~ **charges** ittihamı rədd etmək; *It can't be denied Bu inkar edilə bilməz;* **2.** rədd cavabı vermək, imtina etmək; qıymamaq, verməmək; **to** ~ **a request** xahişi yerinə yetirməmək, xahişi yerinə yetirməkdən imtina etmək; **to** ~ **oneself 1)** özünə qıymamaq; **to** ~ **oneself every luxury** özünə heç bir şey qıymamaq; **2)** özünü / nəfsini saxlamaq, imtina etmək; **3. 1)** danmaq, boynuna almamaq, geri götürmək; **to** ~ *one's* **signature** öz imzasından imtina etmək, öz imzasını danmaq; **to** ~ *one's* **words** öz sözündən boyun qaçırmaq, sözünü geri götürmək; **2)** üz döndərmək, əl çəkmək; **to** ~ *one's* **faith** öz inamından üz döndərmək
**deodorant**[1] [di:'oudərənt] *n* = **deodorizer**
**deodorant**[2] [di:'oudərənt] *adj* iyi yox edən
**deodorize** [di:'oudəraız] *v* xoşagəlməz iyi yox etmək
**deodorizer** [di:'oudəraızə^r] *n* dezodorator *(dezodorasiya cihazı və ya maddəsi)*
**depart**[1] [dı'pa:t] *n arx.* ölüm, vəfat
**depart**[2] [dı'pa:t] *v* **1.** getmək, yola düşmək; *The train departs at 12 Qatar saat 12-də yola düşür;* **2.** çıxıb getmək, tərk etmək; **to** ~ **from London** Londonu tərk etmək; *It's time to depart Çıxıb getmək vaxtıdır;* **3. (from)** aralanmaq, uzaqlaşmaq, kənara çıxmaq; əl çəkmək; dönmək; **to** ~ **from** *one's* **usual mode of life** adi həyat tərzindən uzaqlaşmaq / əl çəkmək; *This passage departs from the original text Bu parça orijinal mətndən kənara çıxır;* **4.** dəyişdirmək; üz döndərmək, əməl etməmək; **to** ~ *one's* **intentions / plans** öz niyyətini / planını dəyişmək; **to** ~ **from** *one's* **word / promise** öz sözünə / vədinə əməl etməmək; **5.** ölmək; **to** ~ **from this life** bu dünyanı tərk etmək, ölmək
**departed** [dı'pa:tıd] *adj arx. şair.* **1.** keçmiş, ötmüş; ~ **joys** keçmiş sevinclər; **2.** ölmüş, mərhum, ölü; **your dear** ~ **brother** sənin /sizin rəhmətlik qardaşın / qardaşınız; **the** ~ *(cəmdə dəyişmir)* rəhmətliklər, ölülər; ölmüşlər; *Let us pray for the departed Gəl/Gəlin ölənlərin ruhuna dua oxuyaq*
**department** [dı'pa:tmənt] *n* **1.** şöbə, bölmə; **press** ~ mətbuat şöbəsi/bölməsi; **export** ~ ixracat şöbəsi; **the Education Department** təhsil şöbəsi; **the men's clothing** ~ kişi paltarı bölməsi; **accounting/accountant's** ~ buxalteriya, mühasibat; **2.** sex *(fabrikdə, zavodda istehsal prosesinin müəyyən sahəsi ilə məşğul olan şöbə);* **3.** mağaza; **fancy goods** ~ qalantereya mağazası; **4.** departament; idarə; **Factory Department** sənaye idarəsi; **Science and Art Department** elm və incəsənət işləri üzrə idarə; **Water Department** su təchizatı idarəsi; **5.** *amer.* nazirlik; **State Department, Department of State** Dövlət Departamenti; **Department of Defense** Müdafiə Nazirliyi; **Department of the Air Force** Hərbi-Hava Qüvvələri Nazirliyi; **Department of the Army** Quru Qoşunları Nazirliyi; **Department of Health, Education and Welfare** Səhiyyə, Təhsil və İctimai Təminat Nazirliyi; **6.** hakimiyyət; **legislative / executive /judiciary** ~ qanunverici / icraedici / məhkəmə hakimiyyəti; **7.** fakültə; kafedra; **physics** ~ fizika kafedrası; **the** ~ **of modern languages** müasir dillər kafedrası; **the history** ~ **of a university** universitetin tarix fakültəsi; **English grammar** ~ ingilis dilinin qrammatikası kafedrası; **8.** sahə *(elm, bilik haq.);* ~ **of knowledge / learning** elm sahəsi; *That is not my department O mənim sahəmə aid deyil*
**departmental** [,dı:pa:t'mentl] *adj* **1.** şöbə, idarə, şöbəyə aid; **a question of** ~ **administration** şöbəyə aid məsələ; **2.** fakültə, kafedra; **a** ~ **meeting** kafedra iclası; **a** ~ **manager** kafedra müdiri
**department store** [,dı:'pa:tmənt'stɔ:] *n* böyük universal mağaza, univermaq
**departure**[1] [dı'pa:tʃə^r] *n* **1.** getmə, yola düşmə *(miniklə),* gediş, çıxma; **on** *smb.'s* ~ bir kəsin getməsindən sonra; **point of** ~ çıxış nöqtəsi; **to take** *one's* ~ çıxıb getmək; **time of** ~ yola düşmə vaxtı; **the** ~ **of the train** qatarın yola düşməsi; **the hour of** ~ getmə /yola düşmə vaxtı; *Their departure was totally unexpected Onların getməsi tamamilə gözlənilməz oldu;* **notices showing arrivals and ~s of trains** qatarların gəlməsi və yola düşməsi haqqında qeydlər, qatarların hərəkət cədvəli; **2.** uzaqlaşma, kənara çıxma; ~ **from truth** həqiqətdən uzaqlaşma; ~ **from the law** qanundan kənara çıxma; ~ **from tradition** ənənədən uzaqlaşma/ kənara çıxma; *The new system is a departure from our usual way Yeni sistem bizim adəti qaydamızdan kənara çıxır;* **3.** çıxış nöqtəsi; **4.** *arx.* ölüm, vəfat
**departure**[2] [dıpa:tʃə^r] *adj* yola düşmə, getmə; ~ **platform** yola düşmə platforması *(qatar haq.)*
**depend** [dı'pend] *v* **1. (on, upon)** asılı/ səbəb olmaq; şərtləşmək; **to** ~ **on/upon the size** ölçüdən asılı olmaq; *Sciences depend upon one another Dəqiq elmlər bir-birindən asılıdır; Prices depend on supply and demand Qiymətlər təklif və tələbdən asılı olur;* **2. (on, upon)** ümid / arxayın olmaq, bel bağlamaq, etibar etmək, inanmaq; **to** ~ **upon what one can earn** öz qazancına bel bağlamaq/ümid etmək; *You may depend upon / on him Sən/siz ona bel bağlaya/etibar edə bilərsən/bilərsiniz;* **3. (on, upon)** kömək/yardım almaq *(bir kəsdən),* bir kəsin öhdəsində olmaq; **to** ~ **upon** *one's* **parents** valideynlərin öhdəsində olmaq; *He depends on his pen for a living O, çörəyini qələmi ilə qazanır*
**dependable** [dı'pendəbl] *adj* etibarlı, sədaqətli,

mötəbər, bel bağlanıla bilən, möhkəm; **a ~ friend** etibarlı /sədaqətli dost; **a ~ car bel** bağlanıla bilən/etibarlı maşın
**dependability** [dɪˌpendə'bɪlɪtɪ] *n* 1. asılılıq, asılı olma; 2. etibarlılıq, sədaqətlilik, mötəbərlik
**dependant** [dɪ'pendənt] *n* 1. ailə üzvü, öhdədə olan; özgə xərcinə dolanan adam; *d.d.* boğazortağı; 2. tabe edilmiş, tabe olan; 3. *tar.* vassal *(1) özündən daha güclü feodaldan asılı olan feodal; 2) daha güclü dövlətdən asılı olan dövlət)*
**dependence** [dɪ'pendəns] *n* 1. asılılıq, asılı olma; **his ~ on his parents** onun valideynlərindən asılılığı; *Our relationship was based on mutual dependence Bizim münasibətimiz qarşılıqlı idi;* 2. tabelilik; **to live in ~ on smb.** bir kəsin çörəyilə yaşamaq; 3. inam, etibar, etimad; **to place/ to put ~ in/on smb.** bir kəsə etibar etmək; **to place / to put ~ on / upon smb.'s word** bir kəsin sözünə inanmaq; 4. dayaq; yaşayış mənbəyi; *He was the girl's sole dependence O, qızın yeganə dayağı idi*
**dependency** [dɪ'pendənsɪ] *n* 1. tabelikdə olan ölkə; *The Hawaiian Islands are no longer dependency of the USA Havay adaları artıq ABŞ-dan asılı ölkə deyil;* 2. asılılıq; **financial ~** maliyyə asılılığı; **drug ~** narkotik maddədən asılılıq
**dependent¹** [dɪ'pendənt] *n* = **dependant**
**dependent²** [dɪ'pendənt] *adj* 1. asılı, asılı olan; şərtləşdirilmiş; **~ on the weather** havadan asılı olan; *It is dependent upon personal taste Bu, şəxsi zövqdən asılıdır; All things in nature are dependent on one another Təbiətdə mövcud olan hər şey bir-birindən asılıdır;* **~ country** asılı ölkə; 2. **(on, upon)** etibar edən, inanan *(bir kəsə / şeyə);* **~ on one's own earnings** öz qazancına etibar edən, öz qazancı ilə yaşayan; 3. **(on, upon)** kömək alan *(bir kəsdən),* öhdəsində olan, bir kəsin hesabına yaşayan; **~ upon one's friends** dostlardan kömək istəyən, dostların köməyinə arxalanan; **~ on charity** ianə ilə yaşayan; 4. *qram.* tabeli; **~ clause** tabeli cümlə; 5. əyilən, sallanan; **~ branch** əyilən/sallanan budaq
**depict** [dɪ'pɪkt] *v* çəkmək *(şəkil);* təsvir etmək; təcəssüm etdirmək, obrazını / surətini yaratmaq; **to ~ a room** otaq şəkli çəkmək *(kətan üzərində);* **to ~ smb.'s destiny** bir kəsin taleyini təsvir etmək; *The artist depicted the woman's lying on a bed Rəssam qadının şəklini çarpayıda uzanmış tərzdə çəkdi; Her novel depicts life in London Onun romanı London həyatını təsvir edir*
**depiction** [dɪ'pɪkʃn] *n* 1. təsvir, təsvir etmə; əks; 2. şəkil; surət; tablo; portret
**depilate** ['depɪleɪt] *v* təmizləmək, tükü yox etmək
**depilation** [ˌdepɪ'leɪʃn] *n* təmizləmə, tükü yox etmə / yolma
**depilatory¹** [dɪ'pɪlɪtərɪ] *n* tükü / qılı təmizləmək üçün vasitə
**depilatory²** [dɪ'pɪlɪtərɪ] *adj* qıl / tük təmizləyən; **~ cream** tük / qıl təmizləyən krem
**deplane** [dɪ:'pleɪn] *v* 1. təyyarədən düşürmək, təyyarədən boşaltmaq; 2. təyyarədən düşürülmək, təyyarədən boşaldılmaq
**deplanement** [dɪ:'pleɪnmənt] *n* təyyarədən düşürülmə / boşaldılma
**deplete** [dɪ'plɪ:t] *v* 1. tükətmək, sərf etmək; qurtarmaq, sərf edib tükətmək/qurtarmaq; tükəndirmək *(ehtiyatı);* boşaltmaq, dağıtmaq; *The election has severely depleted the party's funds Seçki partiyanın fondunu amansızlıqla tükədib / dağıdıb;* **to ~ one's resources** ehtiyatı tükətmək / sərf edib qurtarmaq; **to ~ one's strength** enerjisini/gücünü sərf edib tükətmək; **to ~ one's pocket** cibini boşaltmaq, var-yoxdan çıxmaq; 2. *tib.* 1) bağırsaqları təmizləmək; 2) qan almaq
**depleted** [dɪ'plɪ:tɪd] *adj* 1. tükənmiş, sərf edilmiş, sərf edilib qurtarmış; 2. boşaldılmış
**depletion** [dɪ'plɪ:ʃn] *n* 1. tükənmə, qurtarma; boşalma, dağıtma; 2. faydalı qazıntıların tükənməsi, vəhşicəsinə istismar etmə; 3. *tib.* qanalma; 4. bağırsağı təmizləmə / boşaltma
**depletive¹** [dɪ'plɪ:tɪv] *n* işlətmə dərmanı
**depletive²** [dɪ'plɪ:tɪv] *adj tib.* 1. qanalma; 2. işlətmə
**deplorable** [dɪ'plɔ:rəbl] *adj* 1. qəmli, qüssəli, kədərli, təəssüf ediləcək, təəssüfəlayiq, hüznlü; **~ incident** qəmli / kədərli hadisə; 2. çox pis, yaramaz; **~ behaviour** çox pis / yaramaz davranış; **a ~ performance** çox pis tamaşa; **in a ~ state** çox pis vəziyyətdə
**deplorably** [dɪ'plɔ:rəblɪ] *adv* yaramazcasına, çox pis; **to act ~** yaramazcasına hərəkət etmək; *She acted deplorably O, çox pis / yaramazcasına hərəkət etdi*
**deplore** [dɪ'plɔ:ʳ] *v* təəssüf etmək, heyfsilənmək; acımaq, təəssüfünü bildirmək; **to ~ one's former errors** əvvəlki səhvləri üçün təəssüf etmək / heyfsilənmək; *I deplore the fact that there are so few women in top jobs Mən təəssüf edirəm ki, yüksək vəzifələrdə belə az qadın var*
**deploy** [dɪ'plɔɪ] *v hərb.* 1. genişləndirmək; **to ~ a campaign** kampaniyanı genişləndirmək; 2. yerləşdirmək; *The infantry began to deploy at dawn Piyada qoşun hissələri sübh tezdən cəbhə boyu yerləşdirildi;* 3. genişlənmək; parçalanmaq; *The company deployed Rota genişləndi*
**deployment** [dɪ'plɔɪmənt] *n hərb.* cəbhə boyu düzülmə; **~ abreast** cəbhə boyu yerləşdirmə / düzmə
**depopulate** [dɪ:'pɔpjuleɪt] *v* qırmaq, məhv /tələf etmək *(əhalini);* azaltmaq, seyrəltmək *(əhali haq.); The disease depopulated the island Xəstəlik adanın əhalisini qırdı / azaltdı*
**depopulation** [dɪ:ˌpɔpju'leɪʃn] *n* əhalini qırma / məhv etmə; əhalinin azalması
**deport** [dɪ'pɔ:t] *v* sürgün etmək, sürmək, köçürmək



**deportation** [ˌdɪpɔ:'teɪʃn] *n* sürgün etmə, sürgün, sürmə, köçürmə; qovma, qovalama
**deportee** [ˌdɪ:pɔ:'tɪ:] *n* sürgün edilən, qovulan, sürülən *(adam)*
**deportment** [dɪ'pɔ:tmənt] *n* 1. yeriş-duruş / özünü aparma qaydası; oturuş-duruş; **lessons in ~** yeriş-duruş qaydası dərsləri; *Young ladies used to have lessons in deportment Cavan xanımlar yeriş-duruş qaydası haqqında dərs alardılar;* 2. duruş, görkəm, boy-buxun
**depose** [dɪ'pouz] *v* 1. kənar etmək, götürmək, çıxartmaq *(vəzifədən);* devirmək; **to ~ a king** kralı devirmək / taxtdan salmaq; *The king was deposed in a military coup Hərbi çevrilişlə kral taxt-tacdan salındı;* 2. *hüq.* şahidlik etmək; and içərək yazılı şəhadət vermək; **to ~ against smb.** bir kəsin əleyhinə şəhadət vermək; 3. iddia/ israr etmək, sübut etməyə çalışmaq; **to ~ the contrary** əksini sübut etməyə çalışmaq
**deposit¹** [dɪ'pɔzɪt] *n* 1. banka qoyulan əmanət; **short-time ~** qısamüddətli /müddətli əmanət; **to have money on / upon ~** bankda pul saxlamaq, bankda əmanəti olmaq; **to place money on/upon ~** banka pul qoymaq; 2. ödəmə, vermə; **the first ~ on the farm** fermaya birinci ödəmə *(kreditə alınmış ferma);* 3. beh, girov; 4. anbar, saxlanılan yer; **~ for goods** mal anbarı; 5. *geol.* yataq; mədən, mədən yatağı; **oil / coal ~s, ~ of oil / coal** neft / kömür yataqları; **rich ~** zəngin yataq / mədən
**deposit²** [dɪ'pɔzɪt] *v* 1. banka və ya əmanət kassasına qoymaq, saxlamağa vermək; **to ~ the money in the bank** pulu banka qoymaq; **to ~ money with smb.** pulu saxlamaq üçün bir kəsə vermək; 2. beh vermək; **to ~ a quarter of the price** qiymətin dörddə biri həcmində beh vermək; 3. girov qoymaq; 4. çökdürmək; çöküntü vermək; ərp bağlamaq; 5. yumurta qoymaq; kürü tökmək
**deposition** [ˌdepə'zɪʃn] *n* 1. kənarlaşdırma, çıxartma *(vəzifədən);* devirmə *(taxt-tacdan);* 2. *hüq.* yazılı ifadə; and içməklə ifadə vermə; and içdirməklə ifadə alma; 3. *mal.* pul qoyma, beh; əmanət; 4. çöküntü vermə; çöküntü; ərp; köz, yanıq; 5. *geol.* çöküntü materiallarının yığımı; müasir çöküntülər *(su axını və ya küləklə gətirilən torpaq və s.)*
**depositor** [dɪ'pɔzɪtəʳ] *n* əmanətçi, deponent *(depozitə pul və ya qiymətli kağız qoyan adam)*
**depository** [dɪ'pɔzɪtərɪ] *n* 1. anbar, …saxlanılan yer; **~ for goods** mal anbarı, mal saxlamaq üçün anbar; 2. xəzinə; *He / His mind is a depository of learning O, bilik xəzinəsidir*
**depot** ['depou] *n* 1. anbar, …saxlanılan yer; anbar binası; **grain ~** taxıl anbarı; 2. *hərb.* hərbi düşərgə; 3. *amer.* dəmiryol stansiyası; 4. park; **bus / tram ~** avtobus / tramvay parkı
**depravation** [ˌdeprə'veɪʃn] *n* 1. əxlaqını pozma, yoldan çıxartma, pis yola çəkmə; əxlaqı pozulma; pozğunluq, əxlaqsızlıq, tərbiyəsizlik; 2. patoloji dəyişiklik
**deprave** [dɪ'preɪv] *v* 1. əxlaqını pozmaq, yoldan çıxartmaq, pis yola çəkmək; mənəviyyatını pozmaq; **a film likely to ~ and to corrupt young people** gənclərin əxlaqını və mənəviyyatını pozan film; *His evil friends have depraved him Tərbiyəsiz dostlar onun əxlaqını pozdular / onu pis yola çəkdilər;* 2. pisləşdirmək; təhrif etmək
**depraved** [dɪ'preɪvd] *adj* əxlaqsız, əxlaqı pozğun; pozğun; əxlaqı pozulmuş, zorlanmış, bəkarəti alınmış
**depravity** [dɪ'prævɪtɪ] *n* 1. əxlaqsızlıq, əxlaq pozğunluğu; pozğunluq; 2. əxlaqsız / ədəbsiz hərəkət
**deprecate** ['deprɪkeɪt] *v* qəti etiraz etmək, ciddi ittiham etmək/pisləmək; *Such waste of money is to be deprecated at a time like this Belə bir vaxtda pulu bu cür havaya sovurmaq çox pislənilməlidir; The article deprecates their negative attitude Məqalə onların mənfi münasibətlərini ciddi surətdə ittiham edir*
**deprecating** ['deprɪkeɪtɪŋ] *adj* etiraz bildirən, ittihamedici; pisləyici; **a ~ look** etiraz bildirən / ittihamedici baxış; **a ~ smile** etiraz bildirən təbəssüm
**deprecatingly** ['deprɪkeɪtɪŋlɪ] *adv* pis, mənfi, pisləyici bir tərzdə; **to look ~** pis / pisləyici bir tərzdə baxmaq
**deprecation** [ˌdeprɪ'keɪʃn] *n* etiraz, qəti etiraz, protest; ittiham; **look of ~** etiraz bildirən baxış
**depreciate** [dɪ'prɪ:ʃɪeɪt] *v* 1. qiymətsizləşdirmək, qiymətini/dəyərini aşağı salmaq *(bir şeyin);* **to ~ the currency** valyutanın dəyərini aşağı salmaq, valyutanı ucuzlaşdırmaq; *New cars depreciate quickly Təzə maşınlar tez/sürətlə ucuzlaşır; I have no desire to depreciate your efforts Mənim sənin/sizin səylərini/səylərinizi aşağı salmaq arzum yoxdur;* 2. alçaltmaq, qiymət verməmək, lazımi qədər qiymətləndirməmək; **to ~ oneself** özünü alçaltmaq
**depreciatingly** [dɪ'prɪ:ʃɪeɪtɪŋlɪ] *adv* etinasızlıqla, etinasızcasına, saymazlıqla, saymazyana, məhəl qoymadan; **to speak ~ of smth.** bir şey haqqında etinasızlıqla / saymazyana danışmaq
**depreciation** [dɪˌprɪ:ʃɪ'eɪʃn] *n* 1. qiymətdən salma/salınma; qiymətdən düşmə; dəyərini azaltma /aşağı salma; qiymətini / dəyərini ucuzlaşdırma; **currency ~** valyutanın qiymətdən düşməsi/ucuzlaşması; **~ of gold / silver** qızılın /gümüşün ucuzlaşması; 2. alçaltma, təhqir etmə, hörmətdən salma; alçalma, hörmətdən düşmə; etinasızlıq, saymazlıq, laqeydlik; **to speak in a tone of ~** etinasızlıqla /laqeydliklə danışmaq; 3. *tex.* amortizasiya ( *1) mal. avadanlığın işlənməsi nəticəsində qiymətinin azalması; 2) tex. avtomobil və sairədə zərbə təsirinin azaldılması)*

**depreciative** [dɪ'priːʃɪeɪtɪv] *adj* = **depreciatory**
**depreciatory** [dɪ'priːʃjətərɪ] *adj* **1.** qiymətdən /dəyərdən salan, dəyərini /qiymətini azaldan; **2.** alçaldıcı, həqarətli, təhqiredici
**depredate** ['deprɪdeɪt] *v* oğurlamaq, dağıtmaq, talamaq, talan etmək
**depredation** [ˌdeprɪ'deɪʃn] *n* **1.** talan, qarət, talan/qarət etmə, soyma, çapma; oğurluq, oğurlama, oğurlanma, dağıtma, dağıdılma; vəhşicəsinə qırma/məhv etmə /tələf etmə; **2.** soxulma, zorla girmə; hücum, basqın; **to commit ~** soyğunçuluq etmək; **to make ~s** viran etmək, viranə qoymaq, xaraba qoymaq
**depredator** ['deprɪdeɪtəʳ] *n* soyğunçu, qarətçi, talançı, çapqınçı, quldur, çapovulçu, yolkəsən; təxribatçı, dağıdan, pozan
**depredatory** [dɪ'predətərɪ] *adj* **1.** soyğunçu; **2.** dağıdıcı, məhvedici, pozucu; viranedici; **3.** gözdən / etibardan / nüfuzdan salan
**depress** [dɪ'pres] *v* **1.** boğmaq, yatırtmaq, susdurmaq; zülm / istismar etmək, əsarət altına almaq; **2.** kədərləndirmək, məyus etmək; *The bad news depressed me Qara xəbər məni kədərləndirdi/məyus etdi*; **3.** basmaq; **to ~ a button** düyməni basmaq; *Depress this button in case of fire Yanğın baş versə, bu düyməni bas/basın*; **4.** zəiflətmək; **to ~ the action of the heart** ürəyin fəaliyyətini zəiflətmək; *The trade is depressed Ticarətdə durğunluq yaranıb*; **to ~ *one's* voice** səsini alçaltmaq; **5.** aşağı salmaq/endirmək *(qiyməti və s.)*; **to ~ *one's* eyes** *şair.* gözlərini yerə dikmək
**depressed** [dɪ'prest] *adj* **1.** kədərli, məyus, kefsiz; hüznlü; **~ spirits** kefi pis olma, kefsiz/dilxor ovqat; **2.** zəifləmiş; azaldılmış, aşağı salınmış; **3.** geri qalmış; **~ areas of the country** ölkənin geri qalmış əraziləri/əyalətləri; **4.** çökük, batıq, əyilmiş *(içəri)*; **~ arch** əyilmiş tağ
**depressible** [dɪ'presəbl] *adj* tez kədərlənən / məyus olan /kefi pozulan; *d.d.* dəymədüşər
**depressing** [dɪ'presɪŋ] *adj* qəmgin, kədərləndirici, qəmgətirən, qəmləndirici; **~ landscape** kədərləndirici / qəmləndirici mənzərə; **~ book** qəmgətirən /kədərləndirici / maraqsız kitab
**depressingly** [dɪ'presɪŋlɪ] *adv* məyus-məyus, qəmgin-qəmgin; məyus; həzin-həzin, kədərlə
**depression** [dɪ'preʃn] *n* **1.** depressiya, ruh düşkünlüyü, ruh sarsıntısı; düşkünlük, pozğunluq; **nervous ~** əsəb pozğunluğu; **fit of ~** ruh düşkünlüyünə qapılma; *He committed suicide during a fit of depression Ruh düşkünlüyü zamanı o, özünə qəsd etdi;* **2.** tənəzzül, durğunluq; **~ in / of industry** sənayedə tənəzzül/ durğunluq; **in a state of ~** durğunluq vəziyyətində; **3.** böhran; **the Depression, the Great Depression** *amer.* **1929-30**-cu illərin ümumi böhranı *(ABŞ-da)*; *Many people still remember the Great Depression of the 1930s Çox adam hələ də 1930-cu illərin ümumi böhranını xatırlayır*; **4.** zəifləmə *(intensivlik baxımından)*; **~ of the voice** səsin zəifləməsi; **5.** azalma *(miqdarca)*; **6.** hövzə, çuxur, çala; **a slight ~ in the ground** yerdə kiçik çuxur /çala; *The rain collected in several depressions Yağış bir neçə çuxura yığıldı;* **7.** aşağı düşmüş atmosfer sahəsi; siklon, qasırğa; **~ over island** ada üzərində siklon; *A depression usually brings bad weather Siklon adətən havanı pisləşdirir*
**depressive**[1] [dɪ'presɪv] *n* qəmdən / kədərdən qüssələnən adam, asanlıqla qüssələnən adam
**depressive**[2] [dɪ'presɪv] *adj* üzücü, ağır, əzici; qəmli, qəmgətirən, ürəksıxan; **a ~ illness** üzücü / ağır xəstəlik
**deprivation** [ˌdeprɪ'veɪʃn] *n* **1.** məhrum etmə /edilmə; məhrum olma; məhrumiyyət; **widespread ~ caused by unemployment** işsizlik nəticəsində geniş yayılmış məhrumiyyət; **2.** itki, tələfat; zərər; ziyan, itirmə; **sleep ~** yuxunu itirmə; *Loss of hearing is a great deprivation Eşitmədən məhrum olmaq böyük itkidir*
**deprive** [dɪ'praɪv] *v* **1.** məhrum etmək, əlindən almaq; almaq; zorla almaq; **to ~ *smb.* of his property** bir kəsin əlindən əmlakını / mülkünü almaq, bir kəsi əmlakdan/mülkdən məhrum etmək; **to ~ *smb.* of life** bir kəsi öldürmək; **to ~ *smb.* of his rights** bir kəsin hüquqlarını almaq; *The judge deprived the criminal of his rights Hakim cinayətkarı hüquqlarından məhrum etdi;* **to ~ *smb.* of his reason** ağlını başından almaq, dəli etmək; **2.** *kils.* vəzifədən azad etmək
**deprived** [dɪ'praɪvd] *adj (xüs. adam haq.)* məhrum edilmiş / olmuş, ehtiyac içində olan; kasıb; **~ children** ehtiyac içində olan/kasıb uşaqlar; *The poorest and most deprived people will receive special government help Ən kasıb və ən çox ehtiyac içində olan adamlar xüsusi dövlət köməyi alacaqlar*
**dept** [dept] *n* **department** *sözünün qısa forması (fakültə mənasında)*: **Linguistics Dept** Dilçilik fakültəsi
**depth** [depθ] *n* **1.** dərinlik; **the ~ of the well/of the river/of the mine /of the box, *etc.*** quyunun/çayın/şaxtanın/qutunun və s. dərinliyi; *Water was found at a depth of 20 metre underground Su torpağın 20 metr dərinliyində tapıldı; What is the depth of this lake? Bu gölün dərinliyi nə qədərdir?;* **a metre in ~** bir metr dərinliyində; **2.** *məc.* dərinlik; **~ of knowledge** biliyin dərinliyi; **a man of no great ~** dayaz/səthi adam, səthi düşünən/dərin biliyi olmayan adam; *There is a great depth of meaning in it Burada dərin məna var;* **3.** intensivlik, güc; dərinlik; **the ~ of her love** onun məhəbbətinin gücü /dərinliyi; **~ of sound** səsin intensivliyi / gücü; **~ of colour** rəngin qatılığı/intensivliyi; **the ~ of the forest** meşənin dərinliyi; **in the ~(s) of winter** qışın ortasında; *d.d.* qışın oğlan çağında; **the ~ of the country** ölkənin uzaq/



tənha/xəlvət yeri, mədəni mərkəzdən uzaq yer; **a cry from the ~s** ürəyin dərinliyindən gələn səs; **in the ~ of the night** gecənin yarısında/oğlan çağında / dərinliyində; **4.** qalınlıq, en; **~ of cut** *tex.* yonqarın qalınlığı / eni;
◊ **to be beyond/out of *one's* ~ 1)** dərin yerə düşmək, ayağı dibə dəyməmək; *If you can't swim, don't go out of your depth Əgər üzə bilmirsənsə/bilmirsinizsə, ayağının / ayağınızın dibə dəyməmdiyi yerə getmə/getməyin;* **2)** gücü çatmamaq, başa düşməmək / düşə bilməmək; *When you start talking about economics, I'm totally out of my depth Sən/Siz iqtisadiyyatdan danışmağa başlayanda mən heç nə başa düşmürəm / başa düşə bilmirəm*
**depthless** ['depθlɪs] *adj* **1.** dibsiz, dibi olmayan; çox dərin; hədsiz; **2.** dayaz
**depurge** [dɪ'pɜːdʒ] *v* təmizə çıxartmaq, bəraət qazandırmaq, hüququnu özünə qaytarmaq
**deputation** [ˌdepju'teɪʃn] *n* **1.** millət vəkilləri heyəti, nümayəndə heyəti, nümayəndələr; *The minister agreed to receive a deputation from the railwaymen's trade union Nazir dəmiryolçuların həmkarlar ittifaqının nümayəndə heyətini qəbul etməyə razılıq verdi;* **2.** nümayəndə/deleqat göndərmə
**depute** [dɪ'pjuːt] *v* **1.** ixtiyar/vəkalət vermək *(bir kəsə)*; nümayəndə göndərmək; *They were deputed to put our views to the assembly Bizim fikrimizi iclasa/yığıncağa çatdırmaq üçün onlara ixtiyar/vəkalət verildi;* **2.** işi aparmağı tapşırmaq / həvalə etmək *(bir kəsə)*; öz nümayəndəsi təyin etmək; **to ~ *smb.* in *one's* place** bir kəsi öz yerinə təyin etmək / göndərmək; *I have deputed the keeping of the accounts to John while I am in hospital Mən xəstəxanada olan müddətdə mühasibat işini Cona həvalə etmişəm*
**deputise** ['depjətaɪz] *v* = **deputize**
**deputize** ['depjətaɪz] *v* **1.** təmsil etmək, bir kəsin əvəzinə nümayəndə kimi çıxış etmək; *Mr. John's ill so I'm deputized for him Cənab Con xəstədir; buna görə də onu mən təmsil edirəm;* **2.** millət vəkili seçmək; nümayəndə təyin etmək
**deputy** ['depjutɪ] *n* **1.** nümayəndə; **general ~** tam səlahiyyətli/vəkalətli nümayəndə; **special ~** məhdudlaşdırılmış səlahiyyətə malik nümayəndə; **to do *smth.* by ~** bir işi öz nümayəndəsi vasitəsi ilə etmək/ görmək; **Chamber of Deputies** Nümayəndələr Palatası; **to appoint/to authorize a ~** nümayəndə təyin etmək; **2.** müavin, köməkçi; əvəz; **the Director General and his ~** baş direktor və onun müavini; *I'm acting as deputy till the manager returns Menicer qayıdana kimi mən onu əvəz edirəm*
**deputy minister** ['depjutɪ'mɪnɪstəʳ] *n* nazir müavini
**deputy rector** ['depjutɪ'rektəʳ] *n* prorektor, rektor müavini
**derail** [dɪ'reɪl] *v* **1.** qəza yaratmaq/törətmək *(dəmir yolunda)*, qatarı yoldan çıxartmaq; **2.** relsdən çıxmaq; *The train was derailed by a tree lying across the line Dəmir yol xəttinə köndələn yıxılmış ağac qatarı relsdən çıxartdı*; **3.** pozmaq, şətəl qatmaq, dağıtmaq *(planı və s.)*
**derailment** [dɪ'reɪlmənt] *n* relsdən çıxartma /çıxma *(qatar haq.)*, qəza *(dəmir yolunda)*
**derange** [dɪ'reɪndʒ] *v* **1.** pozmaq, dağıtmaq, pəl vurmaq, qarma-qarışıqlıq salmaq, korlamaq; **to ~ *smb.'s* projects** bir kəsin niyyətini /fikrini / planını pozmaq; **to ~ *smb.'s* constitution** bir kəsin bədən quruluşunu korlamaq; **2.** psixikasını korlamaq, dəli etmək; **to become mentally ~d** dəli olmaq, başına hava gəlmək, havalanmaq, ağlı çaşmaq; **3.** narahat etmək, işdən ayırmaq; *Sorry to have deranged you Səni/Sizi işdən ayırdığım üçün məni bağışla / bağışlayın*
**deranged** [dɪ'reɪndʒd] *adj* psixi baxımdan qeyri-normal; ruhi xəstə, dəli; *She is completely deranged O tamamilə ruhi xəstədir*
**derangement** [dɪ'reɪndʒmənt] *n* **1.** pozma, pozulma, xarab etmə/edilmə; dağıtma, dağıdılma; qarışıqlıq, dolaşıqlıq; **~ of trade** ticarətin pozulması/dağılması; **2.** ruhi pozulma, əqli fəaliyyətin pozulması; **mental ~** ruhi cəhətdən xəstələnmə, dəlilik
**derby** ['daːbɪ] *n* yarış, yürüş; **bicycle ~** velosiped yarışı; **a local football ~** yerli futbol yarışı/oyunu
**derelict**[1] ['derɪlɪkt] *n* **1.** lazımsız olduğu üçün atılan hər hansı bir şey; sahibsiz şey; **2.** komanda tərəfindən tərk edilmiş *(gəmi haq.)*; **3.** səfil, məzlum, nəsibsiz *(adam)*; **~s living on the streets** küçədə yaşayan səfillər / məzlumlar
**derelict**[2] ['derɪlɪkt] *adj* **1.** sahibsiz, yiyəsiz, tərk edilmiş; **a ~ building** sahibsiz bina; **a ~ land** sahibsiz/yiyəsiz torpaq; **to leave *smth.* ~** bir şeyi taleyin ümidinə buraxmaq; **2.** komanda tərəfindən tərk edilmə *(gəmi haq.)*; **3.** səfil, məzlum, rədd edilmiş *(adam)*
**dereliction** [ˌderɪ'lɪkʃn] *n* **1.** pozma; uçulma, dağıtma; xəta, diqqətsizlik, səhv iş, xidməti günah/xəta/qəbahət; **a house in a state of ~** uçma/dağılma vəziyyətində olan ev; **~ of military duty** hərbi borcu pozma; **2.** dənizin sahildən çəkilməsi; dənizin geri çəkilməsi nəticəsində əmələ gələn quru yer
**deride** [dɪ'raɪd] *v* ələ salmaq, lağa/masqaraya qoymaq, rişxənd etmək, istehza etmək
**derider** [dɪ'raɪdəʳ] *n* istehzaçı, rişxəndçi, masqaraçı, adamoynadan, adam ələ salan
**de rigueur** [dərɪ'gɜː] *adj fr.* əxlaqa/etikaya uyğun gələn/münasib olan; *Evening dress is de rigueur at the Casino Axşam paltarı kazino üçün münasibdir/əxlaqa uyğundur*
**derisible** [dɪ'rɪzəbl] *adj* istehzaya/rişxəndə/masqaraya layiq
**derision** [dɪ'rɪʒn] *n* ələ salma, lağa/masqaraya

qoyma; rişxənd; **an object of ~** rişxənd obyekti; **to be in ~** rişxənd/masqara obyekti olmaq, gülünc vəziyyətə düşmək; **to speak with ~** rişxəndlə danışmaq; *Her proposal was greeted / met with howls of derision Onun təklifi rişxənd / gülüş ifadə edən səs-küylə qarşılandı;* **to hold/ to have** ***smb.*** **in ~** bir kəsi lağa qoymaq/ələ salmaq; **to bring** ***smb.*** **into ~, to expose** ***smb.*** **to ~** bir kəsi gülünc vəziyyətə salmaq; *He became an object / target of universal derision O, ümumi gülüş / rişxənd obyektinə / hədəfinə çevrildi*

**derisive** [dɪˈraɪsɪv] *adj* 1. istehzalı; **~ laughter** istehzalı gülüş; **~ tone** istehzalı ton; 2. gülüşdoğuran, gülməli, gülünc; cüzi, çox az/kiçik, dəyərsiz; **~ attempts** gülüşdoğuran / gülünc cəhd

**derisively** [dɪˈraɪsɪvlɪ] *adv* istehza ilə, rişxəndlə; **to speak ~** istehza ilə danışmaq

**derisory** [dɪˈraɪsərɪ] *adj* çox az /kiçik /cüzi

**derivation** [ˌderɪˈveɪʃn] *n* 1. əmələ gəlmə; alınma *(hər hansı bir mənbədən);* **a word of French ~** fransız dilindən alınma söz; mənbə; **~ of minerals** mineralların əmələ gəlməsi; 2. törəmə; 3. *dilç.* sözdüzəltmə; 4. təkamül nəzəriyyəsi

**derivative**[1] [dɪˈrɪvətɪv] *n* 1. törəmə; 2. *dilç.* törəmə söz; *French is a derivative of Latin Fransız dili latın dilinin törəməsidir*

**derivative**[2] [dɪˈrɪvətɪv] *adj* 1. törəmə; ikinci; **~ word** *dilç.* törəmə söz; 2. təkamül; **~ laws** təkamül qanunu; **~ theory** təkamül nəzəriyyəsi *(biologiyada)*

**derive** [dɪˈraɪv] *v* 1. almaq, götürmək, əldə etmək; **to ~** ***one's*** **knowledge from books** biliyini kitablardan almaq; **to ~ benefit from** ***smth.*** bir şeydən xeyir götürmək/mənfəət əldə etmək; **to ~ pleasure from singing** oxumaqdan *(mahnı)* həzz almaq; **to ~** ***one's*** **income from a farm** fermadan dolanmaq; **to ~ great pleasure from art** incəsənətdən böyük həzz almaq; 2. irsən almaq; **to ~** ***one's*** **character from** ***one's*** **father** atanın xasiyyətini irsən almaq

**dermatitis** [ˌdəːməˈtaɪtɪs] *n tib.* dermatit *(dəri iltihabı)*

**dermatosis** [ˌdəːməˈtousɪs] *n tib.* dermatoz *(dəridə xəstəlik vəziyyəti)*

**dermatologist** [ˌdəːməˈtɔlədʒɪst] *n* dermatoloq, dəri həkimi

**dermatology** [ˌdəːməˈtɔlədʒɪ] *n* dermatologiya *(dəri xəstəliklərindən bəhs edən elm)*

**derogate**[1] [ˈderəgɪt] *adj* xarab edilmiş / olmuş, korlanmış, pozulmuş

**derogate**[2] [ˈderəgeɪt] *v* 1. **(from)** azaltmaq, məhdudlaşdırmaq, əskiltmək; qiymətdən / hörmətdən salmaq *(xidməti, ləyaqəti);* pisləmək; ləkələmək, bədnam etmək; **to ~ from** ***smb.'s*** **reputation** bir kəsin adını ləkələmək; **to ~ from** ***smb.'s*** **right** bir kəsin hüququnu məhdudlaşdırmaq/azaltmaq; 2. *arx.* almaq *(bir şeyi);* **to ~ honour from** ***smb.*** bir kəsin namusunu ləkələmək, bir kəsin namusuna/şərəfinə toxunmaq, bir kəsi biabır /rüsvay etmək; 3. özünü alçaltmaq, öz ləyaqətini korlamaq; **to ~ in doing** ***smth.*** bir şeyi etməklə özünü alçaltmaq; 4. *hüq.* qismən ləğv etmək *(qanunu və s.)*

**derogation** [ˌderəˈgeɪʃn] *n* 1. *hüq.* qismən ləğv etmə *(qanunu və s.);* **~ of the powers** səlahiyyəti/vəkaləti ləğv etmə; 2. məhdudlaşdırma, azaltma; qiymətdən/hörmətdən salma, zəiflətmə, sarsıtma *(hakimiyyəti, hörməti və s.);* **to the ~ of** ***smth.*** bir şeyin ziyanına olaraq; *This is not any derogation from their rights Bu onların hüquqlarını əsla məhdudlaşdırmır;* 3. alçaltma, hörmətdən salma; **in a ~ of** ***smb.*** bir kəsi hörmətdən salmaq məqsədilə

**derogatory** [dɪˈrɔgətərɪ] *adj* 1. azaldan, zəiflədən, məhdudlaşdıran; **~ from the rights** hüququ məhdudlaşdıran; **~ from his authority** onun hakimiyyətini/səlahiyyətini məhdudlaşdıran; 2. alçaldan; təhqiredici, alçaldıcı; **~ remarks** təhqiredici məzəmmət; **~ to his dignity** onun ləyaqətini alçaldan

**derrick** [ˈderɪk] *n* 1. derrik *(yükqaldıran kran növü);* 2. buruq vışkası

**derring-do** [ˈderɪŋˈduː] *n* dəlicəsinə qəhrəmanlıq; ağılsızlıq, düşüncəsizlik

**derringer** [ˈderɪndʒəʳ] *n amer.* irikalibrli, qısalüləli tapança

**derv** [dəːv] *n* dizel mühərriki üçün yanacaq

**dervish** [ˈdəːvɪʃ] *n* dərviş

**descant**[1] [ˈdeskænt] *n* 1. düşüncə, fikir, mühakimə; kommentari; izah, şərh; 2. *şair.* mahnı, melodiya, hava, nəğmə; 3. diskant *(zil uşaq səsi və belə səsi olan adam);* soprano *(ən zil qadın səsi)*

**descant**[2] [dɪsˈkænt] *v* 1. **(on, upon)** düşünmək, fikirləşmək, mühakimə etmək; üzərində dayanmaq; izah / şərh etmək, kommentari vermək; 2. *şair.* oxumaq *(mahnı)*

**descend** [dɪˈsend] *v* 1. enmək, düşmək; **to ~ from the mountain** dağdan enmək; *The lift began to descend Lift enməyə/düşməyə başladı; The Sun descended behind the hill Günəş təpənin arxasına endi; Night descends quickly in the tropics Tropik ölkələrdə axşam tez düşür;* 2. aşağı enmək/ düşmək; **to ~ a ladder** nərdivanla aşağı düşmək; *Slowly she descended the stairs O, yavaş-yavaş pilləkənləri endi; At this point the path descends steeply Bu yerdə cığır kəskin surətdə aşağı enir;* 3. törəmək, törənmək, əsli olmaq; *She is descended / descends from an ancient family O, qədim ailədəndir;* 4. keçmək *(irsən)*; **to ~ from father to son** atadan oğula keçmək; 5. əl atmaq; **to ~ to falsehood** yalana əl atmaq; 6. tökülüşmək, tökülüşüb gəlmək; hücum etmək, atılmaq; **to ~ upon the enemy** düşmənin üstünə hücum etmək/ tökülüşmək; *My sister's family is descending on us this week Bacımın ailəsi bu həftə tökülüşüb bizə gələcəklər*



**descendant**[1] [dɪˈsendənt] *n* kök, nəsil; *She claims to be a direct descendant of Napoleon O, iddia edir ki, birbaşa Napoleonun nəslindəndir*

**descendant**[2] [dɪˈsendənt] *adj* enən, meyllənən, aşağı düşən / enən

**descending** [dɪˈsendɪŋ] *adj* 1. enən, meyllənən, aşağı düşən / enən / meyllənən; 2. *riyaz.* azalan *(cərgə haq.)*

**descent** [dɪˈsent] *n* 1. enmə, meyl, eniş; **labourious ~** çətin eniş; **~ of the mountain** dağın enişi; **~ to the valley** dərəyə enmə; *The plane began its descent towards London airport Təyyarə London aeroportuna doğru enməyə başladı;* **the country's swift ~ into anarchy** ölkənin anarxiyaya doğru sürətli meyli; 2. yamac, eniş, dağın döşü; **rocky/gradual ~** qayalıq/ meylli yamac; 3. enmə, aşağı düşmə, zəifləmə; **~ of temperature** temperaturun enməsi/aşağı düşməsi / zəifləməsi; 4. əsil, mənşə; əmələ gəlmə, törəmə; **of a Norman ~** Norman əsilli; **the ~ of a man** insanın mənşəyi/əmələ gəlməsi; **from a similar ~** eyni mənşədən; 5. nəsil, nəsil budağı/qolu; 6. əmlakın nəsildən-nəslə keçməsi, irsən alma/keçmə; **~ of property in the female line** əmlakın irsən ana tərəfdən alınması; **to acquire a title by ~** irsən titul almaq; 7. gözlənilməz hücum *(xüs. dənizdən);* **~ upon the enemy** düşmənə hücum; **to make a ~ upon** *smb.* bir kəsə / bir kəsin üstünə hücum etmək; 8. *mənt.* ümumidən xüsusiyə keçmə;

◊ *A descent from the sublime to the ridiculous is quick ≅ Ölüm gözlə qaş arasındadır*

**describable** [dɪsˈkraɪbəbl] *adj* təsvir oluna bilən, təsvirə gələn

**describe** [dɪsˈkraɪb] *v* 1. təsvir etmək; qələmə vermək; **to ~ a man/a place/an event** adamı /yeri/hadisəni təsvir etmək; *Words cannot describe the beauty of the scene Söz mənzərəni təsvir etməkdə acizdir; The girl described her attacker to the police Qız ona hücum edəni polisə təsvir etdi; Try to describe exactly what happened Çalış/Çalışın nə baş verdiyini dəqiqliyi ilə təsvir et / edin; She describes herself as an inventor O özünü ixtiraçı kimi qələmə verir;* 2. xarakterizə etmək; **to ~** ***smb./smth.*** **as good / to be good** bir kəsi/şeyi yaxşı cəhətdən xarakterizə etmək; *He was described as being very clever Onun çox ağıllı olduğunu dedilər;* 3. *arx.* şəklini çəkmək

**description** [dɪsˈkrɪpʃn] *n* 1. təsvir, təsvir etmə/edilmə; **~ of a storm** tufanın təsviri; **faithful ~** həqiqi təsvir; **~ of** ***smb.'s*** **appearance** bir kəsin xarici görkəminin təsviri; **beyond ~** təsvirəgəlməz, təsvir oluna bilməyən; *The scenery was beautiful beyond description Mənzərə təsvirəgəlməz dərəcədə gözəl idi;* **to give a detailed ~ of** ***smth.*** bir şeyin ətraflı təsvirini vermək; *It baffles/beggars/defies description Bu, təsvirə gəlmir;* 2. təhər, növ, cür, qəbil; çeşid; **books of every ~** hər cür / növ kitablar; **people all ~s** hər cür rütbəli /vəzifəli adamlar; **a lecture of the poorest ~** heç nəyə yaramayan mühazirə

**descriptive** [dɪsˈkrɪptɪv] *adj* 1. təsviri; **~ botany/anatomy** təsviri botanika/anatomiya; **~ grammar/linguistics** təsviri qrammatika / dilçilik; 2.: **~ geometry** tərsimi həndəsə

**descriptively** [dɪsˈkrɪptɪvlɪ] *adv* təsviri surətdə / tərzdə

**desecrate**[1] [ˈdesɪkrɪt] *adj* murdarlanmış; ləkələnmiş, təhqir olunmuş / edilmiş

**desecrate**[2] [ˈdesɪkreɪt] *v* murdarlamaq; ləkələmək, təhqir etmək; **to ~ a grave / church / temple** qəbri / kilsəni / məbədi təhqir etmək

**desecration** [ˌdesɪˈkreɪʃn] *n* 1. murdarlama, murdarlanma; 2. ləkələmə, ləkələnmə; təhqir etmə/edilmə; təhqir, hörmətsizlik

**deseed** [dɪˈsiːd] *v k.t.* toxumunu / tumunu çıxartmaq

**desegregate** [dɪːˈsegrɪgeɪt] *v* seqreqasiyanı/ayrıseçkiliyi ləğv etmək; **to ~ schools** məktəblərdə seqreqasiyanı/ayrıseçkiliyi ləğv etmək/aradan götürmək

**desegregation** [ˌdɪːˌsegrɪˈgeɪʃn] *n* seqreqasiya, ayırma *(ABŞ-da zəncilərin ağlarla bir evdə, hətta şəhərin bir hissəsində yaşamalarına, ağların olduğu yerə zəncilərin gəlmələrinə icazə verilməməsindən və s. ibarət irqçilik siyasəti).* seqreqasiyanı/ayrıseçməni ləğv etmə

**desert**[1] [ˈdezət] *n* 1. səhra, biyaban; **the Sahara Desert** Sahara Səhrası; 2. insan yaşamayan boş yer; 3. maraqsız mövzu; sıxıntı, darıxma, üzüntü

**desert**[2] [ˈdezət] *adj* 1. boş, əhalisiz, adamsız, adam yaşamayan; **~ streets** boş/ adamsız küçələr; 2. bəhrəsiz, barsız, məhsul verməyən; 3. atılmış, tərk edilmiş

**desert**[3] [dɪˈzəːt] *v* 1. atmaq, tərk etmək; qaçmaq, qaçıb qurtarmaq; qoyub getmək; **to ~ a friend** dostu dar ayaqda tərk etmək; **to ~** ***one's*** **family** ailəsini atıb getmək; *He deserted his wife and children and went abroad O, arvadını və uşaqlarını atıb xaricə getdi;* **to ~ the ship** gəmini tərk etmək; **to be ~ed** boş olmaq; *The streets were deserted after a heavy rain Bərk/Güclü yağışdan sonra küçələr boş idi;* 2. fərarilik etmək, qaçmaq *(əsgərlikdən); A soldier who deserts in time of war is punished severely Müharibə vaxtı fərarilik edən/qaçan əsgər ciddi cəzalandırılır*

**deserted** [dɪˈzəːtɪd] *adj* boş, əhalisiz, adamsız; tərk edilmiş, atılmış, baxımsız; **a ~ house** boş / adamsız / tərk edilmiş ev; **a ~ wife** atılmış / tərk edilmiş arvad

**deserter** [dɪˈzəːtəʳ] *n* dezertir, fərari; qaçaq

**desertion** [dɪ'zɜ:ʃn] *n* 1. dezertirlik, fərarilik; **mass ~ in the forces** orduda kütləvi fərarilik; qaçma; *Desertion from the army is punishable by death Əsgərlikdən qaçma/Fərarilik etmə ölümlə cəzalana bilər;* 2. buraxma; tərk etmə /edilmə; yerinə yetirməmə/yetirilməmə; **~ of one's duty** öz borcunu yerinə yetirməmə; 3. baxımsızlıq, nəzarətsizlik, sahibsizlik; boş/ adamsız /xaraba qalma

**desert-ship** ['dezətʃɪp] *n* səhra gəmisi *(yəni dəvə)*

**deserve** [dɪ'zɜ:v] *v* layiq olmaq; dəymək; **to ~ punishment/attention/a reward** cəzaya /diqqətə /mükafata layiq olmaq; **to ~ to be punished** cəzalanmağa/cəza almağa layiq olmaq; *It is more than I deserve Mən buna layiq deyiləm;* **to ~ well of one's country** vətənin qarşısında böyük xidməti olmaq; *He ought to be punished as he deserves Onu əməlinə görə cəzalandırmaq gərəkdir; She deserves some reward for her efforts Cəhdlərinə görə o hər hansı bir mükafata layiqdir; The article deserves careful study Məqaləni diqqətlə öyrənməyə dəyər*

**deserved** [dɪ'zɜ:vd] *adj* layiq, ləyaqətli

**deservedly** [dɪ'zɜ:vɪdlɪ] *adv* ləyaqətlə, ləyaqətinə /xidmətinə görə, haqlı / düzgün olaraq

**deserving** [dɪ'zɜ:vɪŋ] *adj* layiq, layiq olan; **~ of praise** tərifə layiq/layiq olan; **to be ~ of sympathy** rəğbətə layiq/layiq olmaq; **to give money to a ~ cause** pulu layiq olan işə xərcləmək/sərf etmək; *This family is a deserving case Bu ailə rəğbətə layiqdir*

**deshooting** ['dɪ:'ʃu:tɪŋ] *n* kəsmə, zoğları kəsmə *(ağaca forma verərkən)*

**desiccate**[1] ['desɪkɪt] *n* quru ərzaq

**desiccate**[2] ['desɪkeɪt] *v* qurutmaq; nəmliyini itirmək

**desiccated** ['desɪkeɪtɪd] *adj* qurudulmuş; **~ milk** qurudulmuş süd; **~ apples** qurudulmuş alma, alma qaxı

**desiccator** ['desɪkeɪtəʳ] *n* quruducu soba/peç

**design**[1] [dɪ'zaɪn] *n* 1. fikir, niyyət; plan; **far-reaching ~s** uzaqgedən fikir/niyyət; **to have a ~ for / of an insurrection** üsyan planlaşdırmaq; **to frustrate smb.'s ~s** bir kəsin niyyətləri-ni/planlarını pozmaq; **criminal ~** cinayət planı; **to harbour ~s** hiyləgər planlar təklif etmək; **to have ~s on / against smb.'s life** bir kəsin həyatına qəsd etmək; 2. məqsəd, məram, niyyət, arzu, qərəz; **stern ~** möhkəm məqsəd / niyyət; **with a ~** məqsədilə; **without ~** qərəzsiz, niyyətsiz; **by ~** qəsdən, qəsdlə, qərəzlə, qabaqcadan düşünərək; *My design was to go to London Mənim niyyətim Londona getmək idi;* 3. yaradıcılıq planı /niyyəti /məramı; **the composer's ~** bəstəkarın / bəstəçinin planı / niyyəti; 4. çizgi, çertyoj, eskiz; **~ for a building** binanın çertyoju; 5. naxış, bəzək; şəkil; **~ of flowers** gül bəzəyi / naxışı; **poor ~** pis çəkilmiş naxış / bəzək; **arts of ~** təsviri incəsənət; **school of ~** təsviri incəsənət məktəbi; 6. kompozisiya *(quruluş, tərtib); The picture lacks design Şəkildə kompozisiya çatışmazlığı var;* 7. incəsənət əsəri

**design**[2] [dɪ'zaɪn] *adj:* **~ engineer** konstruktor *(konstruksiya müəllifi, konstruksiya düzəldən ixtiraçı);* **~ drawing** iş çertyoju

**design**[3] [dɪ'zaɪn] *v* 1. fikirləşmək, düşünmək, niyyətində/fikrində/qəsdində olmaq *(bir şeyin);* planlaşdırmaq; **to ~ to invite smb.** bir kəsi dəvət etmək fikrində/niyyətində olmaq; 2. irəlicədən/qabaqcadan təyin etmək; əvvəlcədən nəzərdə tutmaq; ayırmaq; **to ~ the room as to be a study** otağı kabinet/iş otağı üçün ayırmaq /nəzərdə tutmaq; **to ~ one's son to be an actor** oğlunu əvvəlcədən aktyor olmaq üçün hazırlamaq/ nəzərdə tutmaq; *The book is designed for the English readers Kitab ingilis oxucuları üçün nəzərdə tutulub;* 3. plan tutmaq, sxem çəkmək; **to ~ a new settlement** yeni qəsəbə salmağı planlaşdırmaq; 4. fikirləşmək, düşünmək; fikrində tutmaq, qərarlaşdırmaq; **to ~ a book** kitab yazmaq haqqında fikirləşmək /düşünmək; 5. çəkmək, cızmaq *(xətt və s.),* sxemini çəkmək /cızmaq; layihəsini çəkmək, yaratmaq; **to ~ a car/a tool** yeni maşın / alət yaratmaq; **to ~ a carpet** xalçanın naxışını / bəzəyini hazırlamaq/çəkmək; **to ~ a dress** paltar modelini yaratmaq; 6. getməyə hazırlaşmaq; **to ~ for France** Fransaya getməyə hazırlaşmaq; 7. *arx.* göstərmək, adı çəkilmək; *The author is not designed Müəllif göstərilməyib, Müəllifin adı çəkilməyib*

**designate**[1] ['dezɪgnɪt] *adj* təyin edilmiş, lakin fəaliyyətə başlamamış

**designate**[2] ['dezɪgneɪt] *v* 1. müəyyənləşdirmək, müəyyən etmək, göstərmək; **to ~ the boundaries of a country** ölkənin sərhədlərini müəyyən etmək/göstərmək; 2. adlandırmaq; **to ~ smth. by a number** bir şeyi rəqəmlə göstərmək; **to ~ smb. as the greatest poet** bir kəsi ən böyük şair adlandırmaq; 3. xəbər vermək; *That designates a coming snowstorm Bu, gələn qar tufanından xəbər verir;* 4. təyin etmək *(vəzifəyə);* **to ~ a manager** menicer təyin etmək; *She has been designated as Minister for Education O, təhsil naziri təyin edilib*

**designation** [ˌdezɪg'neɪʃn] *n* 1. göstərmə, təyin etmə, adlandırma, müəyyən etmə; 2. işarə; ad; **the ~s of the days of the week** həftənin günlərinin adları; 3. vəzifəyə təyin etmə; *Her official designation is Financial Controller Onun rəsmi vəzifəsi maliyyə nəzarətçisidir*

**designer** [dɪ'zaɪnəʳ] *n* 1. konstruktor; layihəçi, layihə mütəxəssisi; 2. çizgiçi, çertyoçu; texniki hesablama mütəxəssisi; 3. rəssam-qrafik, nəqqaş; 4. modelçi; model hazırlayan mütəxəssis; yeni paltar modeli hazırlayan; dizayner; 5. fitnəçi, fəsadçı, iblis, intriqan



**designing** [dɪ'zaɪnɪŋ] *n* 1. layihə düzəltmə / hazırlama / çəkmə, ...layihəsini çəkmə / düzəltmə / hazırlama; qurma, qurulma; 2. planlaşdırma, planını çəkmə; 3. intriqanlıq, fitnəçilik, fitnəkarlıq, fəsadçılıq

**desirability** [dɪˌzaɪərə'bɪlɪtɪ] *n* arzu olunma, istənilmə; lazımlılıq, faydalılıq

**desirable** [dɪˌzaɪərəbl] *adj* 1. arzu olunan, istənilən; **a ~ house/job** arzu olunan ev/ iş; 2. şirnikdirici, cazibəli, həvəs / ehtiras oyadan; xoşagələn; yarayan; **a beautiful and ~ woman** gözəl və ehtiras oyadan qadın

**desirableness** [dɪ'zaɪərəblnɪs] *n* = **desirability**

**desirably** [dɪ'zaɪərəblɪ] *adv* arzuya uyğun gələn/olan tərzdə, arzuya müvafiq olaraq

**desire**[1] [dɪ'zaɪəʳ] *n* 1. coşğun həvəs/arzu; **~ for knowledge** biliyə coşğun həvəs; **~ to do smth.** bir şey etməyə coşğun həvəs/ arzu; **to have no ~ for smth. /to do smth.** bir şeyi etməyə həvəsi/ arzusu olmamaq; **to satisfy smb.'s ~s** bir kəsin arzularını yerinə yetirmək; *I'm filled with desire to go back there Mən ora qayıtmaq arzusundayam, Mən çox arzu edirəm ki, ora qayıdım; He has a strong desire to succeed / for success O, müvəffəqiyyət qazanmağı çox arzu edir;* 2. şəhvət hissi, ehtiras; cinsi əlaqə hissi; **Antony's ~ for Cleopatra** Antonyonun Kleopatraya qarşı şəhvət hissi; 3. arzu, istək, xahiş; **passionate / burning ~s** coşğun/alovlu istəklər/arzular; **by ~** xahişə /istəyə görə; **in accordance with your ~** sənin / sizin xahişinə / xahişinizə müvafiq olaraq; **to have / to get one's ~** öz istəyinə nail olmaq, arzusuna çatmaq, istədiyini əldə etmək; *When the girl agreed to marry him, he felt he had achieved his heart's desire Qız ona ərə getməyə razılıq verəndə ona elə gəldi ki, ürəyinin arzusuna çatdı*

**desire**[2] [dɪ'zaɪəʳ] *v* 1. arzu etmək, istəmək; **to ~ peace / happiness** sülh / xoşbəxtlik istəmək; *I desire happiness / to be happy Mən istəyirəm ki, xoşbəxt olum; Give our guests whatever they desire Qonaqlarımız nə istəsələr ver/ verin;* **to ~ glory** şöhrət arzusunda olmaq; 2. qətiyyətlə tələb etmək; *I desire you to go home at once Mən qətiyyətlə tələb edirəm ki, sən/ siz dərhal evə gedəsən/gedəsiniz; The Queen desires that you (should) come at once Kraliça qətiyyətlə tələb edir ki, sən / siz dərhal gələsən / gələsiniz;* 3. **(with)** cinsi əlaqədə olmağı arzu etmək; **to ~ to have sexual relation with smb.** bir kəslə cinsi əlaqədə olmağı arzu etmək/istəmək

**desired** [dɪ'zaɪəd] *adj* arzu olunan /edilən, əziz, istəkli

**desirous** [dɪ'zaɪərəs] *adj* arzu edən, istəyən, arzusunda olan; **a politician ~ of getting his name in the papers** adının qəzetlərdə çap olunmasını arzu edən siyasətçi; *She has always been desirous of fame /of being famous O, həmişə şöhrət arzusunda olub*

**desist** [dɪ'zɪst] *v* kəsmək, dayandırmaq; əl çəkmək; **to ~ from doing smth.** bir işi görməkdən əl çəkmək; **to ~ an attack** hücumu dayandırmaq, hücumdan əl çəkmək; **to ~ from attempts** təşəbbüsdən əl çəkmək; *I told him not to do it any more, and he desisted Mən ona bunu bir daha etməməyi dedim, o da bundan əl çəkdi*

**desk**[1] [desk] *n* 1. yazı stolu, iş stolu; *He is at his desk all day long O, bütün günü stol arxasındadır / işləyir;* **to sit at the ~** 1) yazmaq; 2) məmur olmaq; 2. parta; **the children sitting at their ~s** parta arxasında oturan uşaqlar

**desk**[2] [desk] *adj* stolüstü, stol üstünə qoyulan; **~ book** stolüstü kitab; **~ set** stolüstü telefon; **~ lamp** stolüstü lampa

**desolate**[1] ['desəlɪt] *adj* 1. atılmış, tullanmış; nəzarətsiz / başlı-başına buraxılmış, tərk edilmiş; 2. boş, adamsız, baxımsız, xaraba, bərbad; 3. tənha, yalqız; **a ~ person** tənha/yalqız adam; **a ~ existence** tənha / yalqız həyat; *We all felt absolutely desolate when she left O gedəndə biz hamımız özümüzü tənha / yalqız hiss etdik*

**desolate**[2] ['desəleɪt] *v* 1. adamsız qalmaq, əhalisi azalmaq, əhalisizləşmək; **to ~ a home** ailəni tərk etmək; *The city was desolated by the plague Taun şəhərin əhalisini demək olar ki, məhv etdi;* 2. viran etmək, xaraba qoymaq, dağıtmaq; məhv / bərbad etmək; **to ~ a country** ölkəni xaraba qoymaq/viran etmək; **to ~ the house** evi talan etmək; 3. tərk etmək, atıb getmək; 4. bədbəxt etmək, ümidsizliyə salmaq

**desolation** [ˌdesə'leɪʃn] *n* 1. viran / məhv / bərbad edilmə, xaraba qoyma/qoyulma, dağıdılma; viranəlik, xarabazarlıq; **to become a ~** viranəliyə/xarabazarlığa çevrilmək; **to fall to ~** viran /məhv/bərbad olmaq; **a scene of utter ~** viranəlik/xarabazarlıq mənzərəsi; 2. təklik, tənhalıq; *His wife's death left him a sense of complete desolation Arvadının ölümü onu tamam tənha qoydu;* 3. kədər, qəm, qüssə, ələm; müsibət, fəlakət; **to bring ~ to smb.** bir kəsi dərdə/qəmə salmaq, bir kəsə müsibət / fəlakət gətirmək

**despair**[1] [dɪs'peəʳ] *n* ümidsizlik, naümidlik, ümidsiz hal/vəziyyət; çarəsizlik, əlacsızlıq; **in the depths of ~** tam ümidsizlik içərisində; **to drive smb. to ~** bir kəsi ümidsizliyə/ümidsiz vəziyyətə salmaq; **to fall into/to sink in ~** ümidsizliyə qapılmaq, ümidsiz vəziyyətə düşmək; *He gave up the struggle in despair O, ümidsiz vəziyyətdə mübarizədən əl çəkdi;* **to drive smb. to ~** bir kəsi ümidsizliyə sürükləmək/salmaq; *His stupidity is driving me to despair Onun gicliyi/səfehliyi/axmaqlığı məni ümidsizliyə sürükləyir; Your son is the despair of all his teachers Sənin/Sizin oğlun/oğlunuz müəllimlərinin hamısını ümidsiz vəziyyətə salıb*

**despair**[2] [dɪs'peəʳ] *v* ümidini kəsmək / itirmək, əlini üzmək, ruhdan düşmək, ümidsiz olmaq,

ümidsizliyə qapılmaq/düşmək; **to ~ of success** qələbəyə ümidini itirmək; *The patient's life is despaired Xəstənin halı ümidsizdir;* **to ~ meeting** *smb.* bir kəslə görüşmək ümidini itirmək; *Don't despair! We'll think of a way out of this! Ümidsizliyə qapılma!/ qapılmayın! Biz bundan bir çıxış yolu tapacağıq*

**despairing** [dɪsˈpeərɪŋ] *adj* ümidsiz; çarəsiz; **~ look** ümidsiz/çarəsiz baxış; **a ~ cry / sigh** ümidsiz ağlama / köksötürmə

**despairingly** [dɪsˈpeərɪŋlɪ] *adv* ümidsiz halda, ümidsizcəsinə, çarəsiz halda/vəziyyətdə, ümidsiz-ümidsiz; *She was looking at me despairingly O mənə ümidsiz-ümidsiz baxırdı*

**despatch**[1,2] [dɪsˈpætʃ] *n, v* = **dispatch**[1,2]

**despecificate** [.di:spɪˈsɪfɪkeɪt] *v* səciyyəvi xüsusiyyətlərdən məhrum etmək

**desperado** [.despəˈra:dou] *n (pl* **-oes**, **-os** [-ouz]) çox qoçaq adam, dəliqanlı; başkəsən, quldur

**desperate**[1] [ˈdespərət] *adj* **1.** ümidsiz, ümidsiz hala/vəziyyətə salınmış; *I was absolutely desperate to see her Mən onu görmək ümidini itirmişdim; The state of economy is now desperate İqtisadiyyatın vəziyyəti indi ümidsizdir;* **2.** ağılsız, düşüncəsiz, ehtiyatsız, tədbirsiz; *She wrote me a desperate letter O mənə ümidsiz bir məktub yazdı;* **3.** şiddətli, qorxulu, xətərli; ağılsız, düşüncəsiz; **~ attempt** ağılsız təşəbbüs; **~ daring** ağılsız cəsarət; **4.** çıxılmaz; **~ condition** çıxılmaz vəziyyət; **~ disease** əlacsız/müalicəsi olmayan xəstəlik; **5.** islaholunmaz, islahedilməz; qəddar, qatı; **~ villain** islah olunmaz yaramaz / əclaf; **~ gambler** qatı qumarbaz; **~ fool** islaholunmaz gic/səfeh; **~ criminal** qatı cinayətkar; **6.** iyrənc, xoşagəlməz; **~ weather** iyrənc hava

**desperate**[2] [ˈdespərɪt] *adv* çox, son dərəcə, həddən artıq

**desperately** [ˈdespərɪtlɪ] *adv* **1.** var qüvvəsilə /gücü ilə, şiddətlə, fədakarcasına; ehtiyatsız, ehtiyatsızcasına, ağılsızca; **to fight ~** var gücü ilə/fədakarcasına vuruşmaq; **2.** ümidsiz halda, ümidsizcəsinə; **3.** çox, son dərəcə, həddən artıq, çox bərk; *I was desperately afraid Mən çox bərk qorxurdum;* **to look ~ ill** son dərəcə xəstə görünmək; **to be ~ anxious** son dərəcə / həddən artıq narahat olmaq

**desperateness** [ˈdespərɪtnɪs] *n* **1.** ümidsizlik; fədakarlıq; **2.** tədbirsizlik, ehtiyat-sızlıq

**desperation** [.despəˈreɪʃn] *n* **1.** ağılsızlıq, düşüncəsizlik; tədbirsizlik; dəlilik; **to drive** *smb.* **to ~** bir kəsi dəli vəziyyətinə salmaq/gətirmək; **2.** ümidsizlik, naümidlik, ümidsiz vəziyyət/ hal; *In desperation I went to a doctor for help Ümidsiz halda / vəziyyətdə mən kömək üçün həkimə getdim*

**despicable** [ˈdespɪkəbl] *adj* **1.** nifrətoyadan /yaramaz, mənfur, həqarətli, nifrətəlayiq; **a ~ action** nifrətoyadan/nifrətəlayiq hərəkət; **a ~ crime** mənfur/nifrətəlayiq cinayət; **2.** *arx.* nifrətli, nifrət ifadə edən, həqarətli

**despicably** [ˈdespɪkəblɪ] *adv* həqarətlə, nifrətlə; yaramazcasına, yaramaz bir tərzdə; **to behave ~** yaramazcasına hərəkət etmək / davranmaq

**despisal** [dɪsˈpaɪzl] *n* nifrət

**despise** [dɪsˈpaɪz] *v (davamedici formalarda işlənmir)* nifrət etmək, alçaq nəzərlə/xor/həqarətlə baxmaq; nəzərə almamaq, heç nə hesab etməmək; *This is not to be despised Bunu nəzərə almamaq olmaz; Strikebreakers are often despised by their fellow workers Fəhlə yoldaşları çox vaxt ştreykbrexerlərə (tətili pozanlara) nifrətlə / həqarətlə baxırlar*

**despite**[1] [dɪsˈpaɪt] *n* **1.** hirs, acıq, kin, qəzəb, ədavət; nifrət; **2.** *arx.* təhqir etmə/edilmə; təhqir, həqarət, alçaltma, ləkələmə; ◊ **in** *smb.'s* **~** bir kəsin ziyanına

**despite**[2] [dɪsˈpaɪt] *v arx.* təhqir etmək, alçaltmaq, ləkələmək

**despite**[3] [dɪˈspaɪt] *prep.* baxmayaraq, əksinə, ziddinə, xilaf/zidd olaraq; **~ my wish** mənim arzuma zidd olaraq; **~ our efforts** cəhdlərimizə baxmayaraq; *They had a wonderful holiday, despite the bad weather Havanın pis olmasına baxmayaraq, onlar yaxşı istirahət etdilər*

**despiteous** [dɪsˈpɪtɪəs] *adj* **1.** hirsli, qəzəbli, acıqlı, kinli; amansız, daşürəkli, insafsız, rəhmsiz; **2.** nifrətli, nifrət ifadə edən, həqarətli, xor; lovğa, təşəxxüslü, təkəbbürlü, iddialı, başqalarına xor baxan, heç kəsi bəyənməyən

**despoil**[1] [dɪˈspɔɪl] *n arx.* soyğun, soyğunçuluq, qarət, talan, çapqın, quldurluq; talama, oğurlama, oğurlanma, oğurluq

**despoil**[2] [dɪˈspɔɪl] *v* soymaq, talamaq, qarət etmək, çalıb-çapmaq; var-yoxdan çıxarmaq; *The army despoiled the village Ordu kəndi talan / qarət etdi*

**despoliation** [dɪ.spoulɪˈeɪʃn] *n* soyğun, soyğunçuluq, qarət, qarət etmə, talan, çapqın, quldurluq, çapovul; oğurlanma, oğurlama

**despond** [dɪsˈpɔnd] *v* ruhdan düşmək, məyus /ümidsiz olmaq; inamını/ümidini itirmək

**despondence** [dɪsˈpɔndəns] *n* ümidsizlik, məyusluq; ruhdan düşmə, ümidsiz olma; qəm, kədər, hüzn; pərtlik, dilxorluq, ruh düşkünlüyü

**despondency** [dɪsˈpɔndənsɪ] *n* = **despondence**

**despondent** [dɪsˈpɔndənt] *adj* məyus, qəmgin, kədərli, hüznlü, dərdli; çox mütəəssir; **a ~ mood** qəmgin / dərdli / kədərli ovqat; *She was despondent about losing her bracelet O, qolbağını itirdiyi üçün çox məyus / mütəəssir idi*

**despot** [ˈdespɔt] *n* despot/ müstəbid/zalım/qaniçən hökmdar; **an enlightened ~** müstəbid/zalım hökmdar; *He rules his family like a real despot O, ailəsini əsl despot / müstəbid kimi idarə edir*

**despotic** [desˈpɔtɪk] *adj* zalım, müstəbid; **~ ruler** zalım / müstəbid hökmdar



**despotical** [desˈpɔtɪkəl] *adj* = **despotic**

**despotically** [desˈpɔtɪkəlɪ] *adv* zalımcasına, müstəbidcəsinə, zalımlıqla, müstəbid kimi

**despotizm, - ism** [ˈdespətɪzm] *n* **1.** despotizm, istibdad; **2.** *məc.* zülmkarlıq, qəddarlıq, müstəbidlik

**dessert** [dɪˈzə:t] *n* desert, çərəz *(xörəkdən sonra verilən meyvə, şirniyyat və s.); What's for dessert? Desertə nə var?*

**dessert-spoon** [dɪˈzə:tspu:n] *n* desert qaşığı

**destination** [.destɪˈneɪʃn] *n* gediləcək yer /ünvan; son mənzil *(səyahət, yürüş və s. zamanı)*; **port of ~** çatacağı liman; **to arrive at** *one's* **~** mənzilbaşına / nəzərdə tutulduğu yerə gəlib çatmaq / varid olmaq; *The parcel was sent to the wrong destination Bağlama yanlış yerə/ünvana göndərilməmişdi; Tokyo was our final destination Tokio bizim çatacağımız son mənzil idi*

**destine** [ˈdestɪn] *v* **1.** təyin etmək, göstərmək, müəyyən etmək; irəlicədən/qabaqcadan/əvvəlcədən təyin etmək; alın yazısı olmaq; **hopes not ~d to be realized** həyata keçməsi mümkün olmayan ümidlər; *They were not destined to meet Onların görüşməsi qismət deyilmiş;* **2.** istiqamətləndirmək, yönəltmək, istiqamət vermək; **to be ~d for some place** bir yerə getmək / yola düşmək; **a vessel ~d for London** Londona yola düşən/gedən gəmi

**destinism** [ˈdestɪnɪzm] *n* fatalizm *(qəzavü-qədərə, qismətə, olacağa inanma)*

**destiny** [ˈdestɪnɪ] *n* **1.** tale, bəxt, qismət, fələk, nəsib, aqibət; **strange ~** qəribə tale / qismət / bəxt; **fortunate ~** xoşbəxt tale / qismət/aqibət; **to settle** *smb.'s* **~** bir kəsin taleyini həll etmək; **to be reconciled to** *one's* **~** taleyilə/qismətilə barışmaq; *Destiny drew us together Tale bizi birləşdirdi; Destiny is sometimes cruel Fələk bəzən qəddar / amansız olur;* **2.** labüdlük, zərurilik; alın yazısı; *She is my destiny O mənim alın yazımdır*

**destitute**[1] [ˈdestɪtju:t] *n top. i* kasıblar, binəsiblər

**destitute**[2] [ˈdestɪtju:t] *adj* **1.** bərk ehtiyac içində olan; kasıb; **to be left ~** heç nəyi qalmamaq; *When he died, his family was left completely destitute O öləndə ailəsi heç nəsiz qaldı;* **2.** məhrum, məhrum edilmiş; **~ of feeling** hissdən məhrum edilmiş; *They seem destitute of ordinary human feelings Görünür, onlar adi insani hisslərdən məhrumdurlar; The cruel man was destitute of human feeling O qəddar kişi insani hissdən məhrum idi*

**destitution** [.destɪˈtju:ʃn] *n* **1.** ehtiyac, məhrumiyyət, yoxsulluq, kasıblıq, səfalət; **to live in complete ~** tam ehtiyac/səfalət içərisində yaşamaq; **to bring ~** var-yoxdan çıxartmaq, dilənçi kökünə salmaq; **left in a state of ~** heç nəsiz vəziyyətdə qoyulmuş; **2.** məhrum etmə; çatışmazlıq, yoxluq, olmama; **~ of all human feelings** insani hisslərdən məhrum olma; **3.** çıxartma, azad etmə *(vəzifədən)*

**destroy** [dɪsˈtrɔɪ] *v* **1.** uçurmaq, sökmək, dağıtmaq; xarabazara döndərmək; **to ~** *smth.* bir şeyi dağıtmaq/uçurmaq/xarabazara çevirmək; **to ~ a building** binanı uçurmaq/sökmək / dağıtmaq; *The enemy destroyed the city Düşmən şəhəri dağıtdı /xarabazara döndərdi;* **2.** *məc.* puç etmək, boşa çıxartmaq; **to ~** *smb.'s* **hopes/plans, etc.** bir kəsin ümidlərini / planlarını və s. puç etmək; *You have destroyed my life and all my hopes Sən/Siz mənim həyatımı və bütün ümidlərimi puç etmisən/etmisiniz;* **3.** sındırmaq, xarab etmək, yararsız hala salmaq, korlamaq; **to ~ a dress** paltarı korlamaq/yararsız hala salmaq; **4.** məhv/tələf etmək, yoxa çıxarmaq; **to ~ a document** sənədi məhv etmək; **to ~ a reputation** adı/şöhrəti məhv etmək; **5.** öldürmək, başını əkmək; *The injured horse had to be destroyed Yaralanmış atı öldürmək lazım idi*

**destroyer** [dɪsˈtrɔɪəʳ] *n* **1.** dağıdan, məhv/ xarab edən, pozan; *Drought is a major destroyer of crops Məhsulu əsasən məhv edən quraqlıqdır;* **2.** *dən.* esmines *(mina daşıyan eskadra gəmisi);* **3.** *av.* qırıcı təyyarə; **4.** *amer. hərb.* tank əleyhinə özüyeriyən top

**destructibility** [dɪs.trʌktɪˈbɪlɪtɪ] *n* dağıdılma, dağılma, davamsızlıq

**destructible** [dɪsˈtrʌktəbl] *adj* dağıla/yıxıla /uçula/pozula bilən; davamsız, tezdağılan

**destruction** [dɪsˈtrʌkʃn] *n* **1.** dağıtma, üçurtma, viran/xarab etmə; dağılma, uçulma, xarab / viran edilmə; talan etmə / edilmə; müflis olma/etmə; məhv etmə/edilmə, qırğın; **~ by fire** yanğın tərəfindən viran edilmə; **to bring to ~** dağıtmaq, viran etmək/qoymaq; var-yoxdan çıxarmaq; gətirib məhvə çıxartmaq; **weapons of mass ~** kütləvi qırğın silahları; **2.** var-yoxdan çıxmanın səbəbi; *Gambling was his destruction Qumar oynamaq onun axırına çıxdı;* **3.** öldürmə, məhv etmə; **~ of beasts of prey** yırtıcı heyvanları məhv etmə; **4.** puça çıxma, puç olma; **~ of hopes** ümidlərin puça / boşa çıxması

**destructive** [dɪsˈtrʌktɪv] *adj* **1.** dağıdıcı; **the ~ force of the storm** tufanın dağıdıcı gücü; **a ~ storm** dağıdıcı tufan; **2.** məhvedici; **~ criticism** məhvedici tənqid; **3.** çox zərərli, ziyanlı, zərərverən; **~ example** zərərli nümunə; **to be ~ of** *smth.* bir şeyə zərərli təsir göstərmək; **~ of / to health** səhhətə / sağlamlığa zərərli

**destructively** [dɪsˈtrʌktɪvlɪ] *adv* dağıdıcı tərzdə / surətdə; məhvedici bir surətdə; çox pis, fəlakətli; zərərli

**destructiveness** [dɪsˈtrʌktɪvnɪs] *n* dağıdıcılıq, pozuculuq; zərərlilik

**destructor** [dɪsˈtrʌktəʳ] *n* **1.** dağıdan, xarab edən, pozan; **2.** zibil yandırılan peç

**desultorily** ['desəltərılı] *adv* rabitəsiz, qırıq-qırıq, əlaqəsiz; məqsədsiz
**desultoriness** ['desəltərınıs] *n* rabitəsizlik, əlaqəsizlik, qırıq-qırıqlıq
**desultorious** [,desəl'tɔ:rıəs] *adj* = **desultory**
**desultory** ['desəltərı] *adj* rabitəsiz, qarışıq, dolaşıq, bir-birini tutmayan *(fikir, nitq haq.)*, qırıq; qeyri-sistematik; məqsədsiz, niyyətsiz; ~ **remarks** rabitəsiz/dolaşıq/ bir-biri ilə uzlaşmayan mülahizələr; ~ **reading** məqsədsiz /qeyri-sistematik oxu; ~ **fire/flight** nizamsız atəş/qaçış; **to keep up a ~ conversation** rabitəsiz/məqsədsiz söhbət aparmaq
**detach** [dı'tætʃ] *v* 1. ayırmaq, əlaqəsini kəsmək; **to ~ a region from a country** vilayəti ölkədən ayırmaq; **to ~ one country from another** bir ölkəni o birindən ayırmaq; 2. açmaq, aralamaq; **to ~ a wagon from a train** vaqonu qatardan açmaq; **to ~ a watch from a chain** saatı zəncirdən açmaq; **to ~ oneself from** *smb. /smth.* bir kəsdən /şeydən aralanmaq; *She detached herself from the group and came over to join me O, qrupdan ayrılıb/aralanıb mənə qoşuldu;* 3. *hərb.* göndərmək, yollamaq *(hərbi bölməni, gəmini);* başqa şəxsin ixtiyarına göndərmək
**detachable** [dı'tætʃəbl] *adj* 1. cırılan, qoparılan *(təqvim, blank və s.);* kəsilən; ayrılan; 2. siyirmə, çıxarılan, çıxarılıb bilən, çıxarılıb taxılan; **a ~ lining in a coat** paltoda çıxarılıb taxıla bilən astar; ~ **section** *tex.* siyirmə / çıxarılıb taxıla bilən hissə
**detached** [dı'tætʃt] *adj* 1. ayrı, tək, ayrı-ayrı; əlahiddə; əlaqəsi olmayan; ayrılmış, xüsusiləşmiş; ~ **event** əlahiddə hadisə; ~ **foundation** ayrı / əlahiddə özül; **a theory ~ from the life** həyatla əlaqəsi olmayan nəzəriyyə; ~ **battalion** ayrı/ əlahiddə batalyon; 2. qərəzsiz, bitərəf, müstəqil, özünəməxsus; ~ **view** müstəqil fikir / rəy
**detachedly** [dı'tætʃtlı] *adv* 1. ayrıca, təkbaşına, təkcə, yalqız, ayrıca olaraq, kənarda; 2. qərəzsiz, qərəzsiz olaraq, üzgörmədən, ədalətlə, insafla
**detachment** [dı'tætʃmənt] *n* 1. ayırma, ayrılma; açma, açılma; 2. qərəzsizlik, üzgörməzlik, bitərəflik; sərbəst olma, müstəqillik, sərbəstlik *(fikir, mühakimə və s. haq.);* 3. ayrılıq, əlaqəsizlik, rabitəsizlik, uzaqlıq, soyuqluq *(əlaqədə, münasibətdə);* 4. *hərb.* topa və ya minomyota qulluq edən əsgər dəstəsi; 5. *hərb.* müəyyən vəzifəni yerinə yetirmək məqsədilə bir yerə göndərilmiş hərbi dəstə/gəmi və s.; 6. laqeydlik; ifadəsizlik *(üzdə);* **an air of ~** laqeyd görkəm; *He answered with an air of detachment O, laqeydcəsinə cavab verdi*
**detail**[1] ['di:teıl] *n* 1. təfsilat, təfərrüat; **in ~** ətraflı, ətraflı surətdə, təfsilatı ilə, təfərrüatı ilə, müfəssəl; **to give all the ~s** təfsilatı ilə/təfərrüatı ilə/ müfəssəl surətdə danışmaq; **to go / to enter into ~s** təfərrüata / təfsilata varmaq; **to leave out ~s** təfsilatları nəzərə almamaq; 2. xırda təfərrüat /təfsilat / xüsusiyyət; **full of uninteresting ~s** xırda maraqsız təfsilatlarla dolu; *This is only but a detail, This is a mere detail Bu ancaq quru təfərrüatdır; məsələyə elə bir prinsipial təsiri yoxdur;* 3. hissə, detal *(maşının, binanın);* 4. müfəssəl çertyoj; 5. dəstə, komanda, taqım; **general / particular ~** ümumi / xüsusi dəstə; 6. *tel.* dəqiqlik, aydınlıq
**detail**[2] ['di:teıl] *v* 1. ətraflı təsvir etmək/ danışmaq; **to ~ all the facts** bütün faktları təfərrüatı / təfsilatı ilə söyləmək; 2. *hərb.* ayırmaq, təyin etmək, göndərmək *(növbətçi/qarovul dəstəsi və s.);* **to ~ smb. for guard duty** bir kəsi qarovul təyin etmək; 3. müfəssəl çertyoj çəkmək
**detailed** ['di:teıld] *adj* 1. ətraflı, hərtərəfli; müfəssəl; əsaslı; **a ~ description** əsaslı / hərtərəfli təsvir; **a ~ analysis** müfəssəl / əsaslı təhlil; ~ **study** ətraflı / hərtərəfli / müfəssəl tədqiqat; ~ **interrogation** ətraflı sorğu-sual/istintaq /dindirmə; ~ **decontamination** *hərb.* əsaslı dezaktivasiya; 2. *hərb.* təyin edilmiş, ezamiyyətə göndərilmiş
**detain** [dı'teın] *v* 1. yubatmaq, saxlamaq, ləngitmək, gecikdirmək; **to ~ smb.** bir kəsi yubatmaq/ləngitmək; *He was detained by business İş onu ləngidib/gecikdirib; Don't let me detain you Səni/Sizi yubatmayacam;* 2. saxlamaq, həbs etmək; göz altına almaq; *The police detained him for questioning Polis onu dindirmək üçün saxladı;* 3. *arx.* tutmaq *(əmək haqqından)*
**detained** [dı'teınd] *adj* 1. yubadılmış, ləngidilmiş, saxlanılmış, dayandırılmış; 2. tutulmuş, tutulan *(maaşdan)*
**detainee** [,di:teı'ni:] *n hüq.* tutulmuş, göz altına alınan *(adam),* saxlanılmış *(adam),* dustaq; **political ~s** siyasi dustaqlar
**de-tank** [di:'tæŋk] *v* tankdan düşmək
**detect** [dı'tekt] *v* 1. aşkar etmək, tapmaq, üstünü açmaq; **to ~ the murderer** qatili tapmaq; **to ~ smb. in the act** bir kəsi cinayət başında yaxalamaq; *Small quantities of poison were detected in the dead man's stomach Ölmüş kişinin mədəsində az miqdarda zəhər aşkar edildi;* 2. görmək, müşahidə etmək, sezmək, duymaq; **to ~ a smell** iy / qoxu sezmək; *I seem to detect some anger in his voice Mən onun səsində bir az əsəbilik duyuram*
**detectable** [dı'tektəbl] *adj* sezilən, hiss edilə bilən, aşkar oluna bilən, aşkarlana bilən; ~ **signs of unease among government ministers** hökumət nazirləri arasında sezilən / hiss edilə bilən narahatlıq əlamətləri
**detectible** [dı'tektəbl] *adj* = **detectable**
**detective**[1] [dı'tektıv] *n* 1. detektiv, xəfiyyə, xəfiyyə agenti; casus; **to employ a private ~** xüsusi detektiv tutmaq; 2. detektiv roman *(cinayət romanı)*
**detective**[2] [dı'tektıv] *adj* 1. detektiv; ~ **novel / stories** detektiv roman/hekayələr; 2. axtarış; ~ **police** axtarış polisi; ~ **agency** detektiv /axtarış idarəsi;
**detector** [dı'tektə'] *n* 1. aşkar edən / tapan / müəyyənləşdirən cihaz; **a gas ~** qazı müəyyənləşdirən cihaz; **a smoke ~** tüstü təmizləyən / tutan cihaz; *All homes should be fitted with smoke detectors Bütün evlərdə tüstü təmizləyən cihaz quraşdırılmalıdır;* 2. detektor, dalğa tutan *(radio aparatında dalğatutan cihaz);* 3. *kim.* indikator *(kimyəvi reaksiyanın qurtardığını göstərən maddə; reaktiv)*
**detente** [,de'ta:ŋt] *n fr.* gərginliyin zəifləməsi *(xüs. dövlətlər arasındakı münasibətlərdə);* **a period of ~** gərginliyin zəifləməsi dövrü
**detention** [dı'tenʃn] *n* 1. ləngitmə, ləngimə; yubanma, yubatma, gecikmə, gecikdirmə; saxlama, saxlanma; ~ **after school hours** dərsdən sonra saxlama *(cəza növü);* **accidental ~ on a journey** səfər zamanı/vaxtı təsadüfən yubanma; 2. tutma, həbs etmə, istintaq altında saxlama; **illegal ~** qeyri-qanuni olaraq həbsxanada saxlama; ~ **without trial** məhkəməsiz həbs etmə
**deter** [dı'tə:'] *v* (-rr-) (from) tutmaq, saxlamaq, tutub saxlamaq; çəkindirmək, qorxutmaq; dayandırmaq; **to ~ smb. from trying again** bir kəsi yeni təşəbbüs göstərməkdən çəkindirmək; *The weather deterred them from going for a picnic Hava onları çölə gəzintiyə getməkdən çəkindirdi; What is the best way to deter young people from taking up smoking? Cavanları papiros çəkməkdən çəkindirmək üçün ən yaxşı yol nədir? The fact that we have these weapons will deter our enemies from attacking us Bu silahların bizdə olması faktı düşmənlərimizi bizə hücum etməkdən çəkindirəcək*
**deterge** [dı'tə:dʒ] *v tib.* təmizləmək; yumaq, yuyub təmizləmək
**detergency** [dı'tə:dʒənsı] *v* yuma qaydası; yuma təsiri / qüvvəsi / qabiliyyəti
**detergent**[1] [dı'tə:dʒənt] *n* 1. yuyucu maddə; **dishwasher ~s** qab yumaq üçün yuyucu maddə; 2. *tib.* işlətmə dərmanı
**detergent**[2] [dı'tə:dʒənt] *adj* təmizləyici, yuyucu
**deteriorate** [dı'tıərıəreıt] *v* 1. korlamaq, pisləşdirmək, qiymətini / dəyərini aşağı salmaq; **to ~ the value of** *smth.* bir şeyin qiymətini / dəyərini aşağı salmaq; 2. pisləşmək, korlanmaq; *His health deteriorated rapidly and he died two weeks later Onun səhhəti sürətlə pisləşdi və o, iki həftədən sonra öldü;* 3. nəsli / cinsi pozulmaq, cırlaşmaq, nəsli kəsilmək
**deteriorating** [dı'tıərıəreıtıŋ] *adj* pisləşən; ~ **weather** pisləşən hava; ~ **health condition** pisləşən sağlamlıq vəziyyəti
**deterioration** [dı,tıərıə'reıʃn] *n* 1. pisləşmə; **a rapid ~ in relations between the two countries** iki ölkə arasında əlaqələrin sürətlə pisləşməsi; 2. xarab olma, korlanma, yeyilmə
**deteriorative** [dı'tıərıə,reıtıv] *adj* 1. dağıdıcı, pozucu, məhvedici; 2. pisləşən, korlanan, xarab olan
**determinant**[1] [dı'tə:mınənt] *n* 1. həlledici / əsas amil / faktor; *Is cost or comfort the determinant in choosing a new car? Yeni maşın seçməkdə əsas/həlledici amil qiymətdir yoxsa rahatlıq?;* 2. *riyaz.* determinant, təyinedici
**determinant**[2] [dı'tə:mınənt] *adj* = **determinative**[2]
**determinate** [dı'tə:mınıt] *adj* 1. bərqərar / müəyyən edilmiş; qoyulmuş; ~ **order** qoyulmuş / müəyyən edilmiş qayda; 2. qəti, son; ~ **reply** qəti / son cavab; 3. cəsarətli, əzmli, qərarından dönməyən; ~ **character** sərt xarakter
**determinately** [dı'tə:mınıtlı] *adv* 1. qəti, aydın, qəti / aydın surətdə; 2. cəsarətlə, əzmlə, mətanətlə, qətiyyətlə
**determination** [dı,tə:mı'neıʃn] *n* 1. əzm, qətiyyət, cəsarət; qətilik, səbat; **with ~** qətiyyətlə, əzmlə, cəsarətlə; ~ **to do** *smth.* bir şeyi etmək qətiyyəti/əzmi/cəsarəti; **to move smb. from his ~** bir kəşin əzmini/qətiyyətini sındırmaq; **a leader of courage and ~** cəsarətli və qətiyyətli rəhbər; *The police chief spoke of his determination to catch the killer Polis rəisi canini tutacağını qətiyyətlə dedi;* 2. müəyyən/təyin etmə; ~ **of price** qiymətin müəyyən/təyin edilməsi; 3. ölçmə; ölçülmə; ~ **of a wave-length** dalğanın uzunluğunu ölçmə; 4. *hüq.* qərar, qətnamə; **to come to a ~** qərara gəlmək; 5. istiqamət; cəhd, meyl; 6. *tib.* axma, yığılma *(qan və s. haq.)*
**determinative**[1] [dı'tə:mınətıv] *n* 1. həlledici amil/faktor; 2. *qram.* təyinedici söz
**determinative**[2] [dı'tə:mınətıv] *adj* 1. təyin / müəyyən edən, təyinedici; 2. həlledici, həll edən; əsas, başlıca
**determinator** [dı'tə:mıneıtə'] *n* = **determiner**[1]
**determine** [dı'tə:mın] *v* 1. təyin /müəyyən etmək; **to ~ a date for a meeting** iclasın tarixini müəyyən/təyin etmək; **to ~ smb.'s duties** bir kəsin vəzifəsini müəyyən etmək; **to ~ the meaning of a word** sözün mənasını müəyyən etmək; **to ~ the speed of light** işığın sürətini təyin etmək; *A chance meeting determined his future Təsadüfi bir görüş onun gələcəyini müəyyən etdi; The exam results could determine your career İmtahanın nəticələri sənin/sizin karyeranı/karyeranızı müəyyənləşdirə bilərdi;* 2. ölçmək, müəyyən/aşkar etmək; **to ~ the saltness of sea-water** dəniz suyunun duzluluğunu ölçmək/müəyyənləşdirmək/aşkarlamaq; 3. səbəb olmaq, şərt qoymaq; **to ~ the choice** seçimi müəyyənləşdirmək; 4. təhrik/məcbur etmək; **to ~ smb. to smth.** bir kəsi bir şeyə təhrik etmək; *This determined him to act at once Bu onu dərhal hərəkət etməyə təhrik etdi;* 5. həll etmək, cavabını tapmaq; **to ~ the case** məsələni həll etmək; 6. qərara gəlmək, qə-

rar çıxartmaq; *He determined to learn English O, ingilis dilini öyrənmək qərarına gəldi; He determined to go at once O dərhal getmək qərarına gəldi*; 7. qurtarmaq, son qoymaq; **to ~ the crisis** böhrana son qoymaq

**determined** [dɪ'tə:mɪnd] *adj* 1. qətiyyətli, cəsarətli, ürəkli, əzmli, səbatlı, qərarından dönməyən; **a ~ look** qətiyyətli / cəsarətli baxış; **a ~ attitude** əzmli/qətiyyətli münasibət; **a ~ character** 1) möhkəm xarakter; 2) qətiyyətli / cəsarətli adam; **~ attack** qətiyyətli/cəsarətli zərbə /hücum; 2. müəyyənləşdirilmiş, müəyyən edilmiş; **~ price** müəyyən edilmiş qiymət

**determiner** [dɪ'tə:mɪnəʳ] *n* 1. müəyyən / təyin edən, müəyyənləşdirən *(adam)*; 2. *dilç.* təyin edən söz

**determinism** [dɪ'tə:mɪnɪzm] *n fəls.* determinizm *(bütün hadisələrin qanunauyğunluğu və səbəbiyyət əlaqəsindən asılı olduğu haqqında nəzəriyyə)*

**determinist** [dɪ'tə:mɪnɪst] *n* determinist *(determinizm tərəfdarı)*

**deterrence** [dɪ'terəns] *n* 1. saxlama, saxlanma; qarşısını alma; 2. qorxutma, qorxudulma; vahiməyə salma / salınma; vahimə; **nuclear ~** nüvə vahiməsi; 3. hədə / qorxu vasitəsi, hədə-qorxu vasitəsi

**deterrent¹** [dɪ'terənt] *n* 1. hədə/vahimə vasitəsi, qarşısını alma vasitəsi; *His punishment will be a deterrent to others Onun cəzalandırılması başqalarında qorxu yaradacaq;* 2. *kim.* reaksiyanı ləngidən/yavaşıdan *(vasitə)*

**deterrent²** [dɪ'terənt] *adj* qarşısını alan/saxlayan, maneçilik törədən; mane olan; qorxudan, hürküdən, vahiməyə salan; **~ weather** əlverişsiz hava; **~ diplomacy** qabağını alma siyasəti

**detest** [dɪ'test] *v (Davamedici zamanda işlənmir)* zəhləsi getmək, acığı gəlmək; nifrət etmək/bəsləmək; görməyə gözü olmamaq; **to ~ *smb.* / *smth.*** bir kəsdən / bir şeydən zəhləsi getmək, bir kəsə/bir şeyə nifrət etmək; *I detest people complaining Mənim gileyləNən/deyingən adamı görməyə gözüm yoxdur; I detest people who tell lies Yalan danışan adamlara nifrət edirəm; They detest war Onlar müharibəyə nifrət edirlər*

**detestable** [dɪ'testəbl] *adj* zəhlətökən, nifrət oyadan, nifrətəlayiq; iyrənc; **~ child** zəhlətökən uşaq; **~ act** iyrənc hərəkət; **~ habit** nifrətəlayiq / iyrənc adət

**detestableness** [dɪ'testəblnɪs] *n* iyrənclik, mənfurluq, murdarlıq

**detestably** [dɪ'testəblɪ] *adv* çox pis, murdar, iyrənc, mənfur; çirkin

**detestation** [ˌdɪ:tes'teɪʃn] *n* 1. güclü nifrət, ikrah; **fierce ~** qatı nifrət/ikrah; **~ of *smb.*** bir kəsə nifrət; **to be in ~** nifrət / ikrah oyatmaq; **to hold / to have *smb.* in ~** bir kəsə nifrət bəsləmək; 2. ikrah doğuran şey, iyrənc / mənfur / çox pis adam

**dethrone** [dɪ'θroun] *v* 1. devirmək, taxt-tacdan məhrum etmək; hakimiyyətdən salmaq; 2. kənar etmək, çıxartmaq *(vəzifədən)*

**dethronement** [dɪ'θrounmənt] *n* 1. taxt-tacdan məhrum etmə, devirmə; 2. kənar etmə, çıxarma *(vəzifədən)*

**detonate** ['detouneɪt] *v* 1. partlamaq; *The bomb failed to detonate Bomba partlamadı;* 2. partlatmaq; **to ~ a nuclear device** nüvə qurğusunu partlatmaq

**detonation** [ˌdetou'neɪʃn] *n* 1. partlama, partlayış; 2. gurultu; partıltı, şaqqıltı, gumbultu

**detonator** ['detəneɪtəʳ] *n* detonator *(partlayıcı kapsul)*

**detour** [dɪ'tuəʳ] *n* dolama yol; dolanma, dolayı yol; **~s of a river** çayın dirsəkləri; **to make a ~** dolanmaq, dolanıb keçmək; *We had to make a detour round the floods Biz selin ətrafından dolanıb keçməli olduq*

**detract** [dɪ'trækt] *v* 1. alçaltmaq; əskiltmək, kiçiltmək, azaltmaq; hörmətdən/ qiymətdən salmaq; **to ~ from the value** qiymətini azaltmaq/kiçiltmək; **to ~ from worth** dəyərini aşağı salmaq/azaltmaq; **to ~ from the merit** ləyaqətini azaltmaq/kiçiltmək; *This does not detract from his merit Bu onun ləyaqətini azaltmır; Anger detracts much from her beauty Hirs onun gözəlliyinə xələl gətirir;* 2. çıxmaq, azaltmaq; **to add or to ~** üstə gəlmək, yaxud çıxmaq; 3. *amer.* yayındırmaq *(diqqəti)*

**detraction** [dɪ'trækʃn] *n* 1. azaltma, əskiltmə, alçaldılma, əskildilmə; hörmətdən salma/salınma; hörmətdən düşmə; 2. qeybət, qeybət etmə, dalca danışma; dedi-qodu; **to listen to ~** dedi-qoduya inanmaq/qulaq asmaq

**detractive** [dɪ'træktɪv] *adj* alçaldan, əskildən, hörmətdən salan; **~ from the merits of a book** kitabın qiymətini/dəyərini azaldan; **~ from *smb.'s* reputation** bir kəsin şərəfini / adını korlayan

**detractor** [dɪ'træktəʳ] *n* 1. alçaldan, hörmətdən salan, kiçildən; 2. böhtançı, iftiraçı, şəratan, şərbaz

**detrain** [di:'treɪn] *v* 1. qatardan düşürmək / endirmək; 2. boşaltmaq *(vaqonu)*; boşaltmaq *(yükü)*; 3. qatardan düşmək / enmək

**detrainment** [di:'treɪnmənt] *n* 1. düşmə, enmə; düşürülmə, endirilmə; 2. boşalma, boşaltma; boşaldılma, yükü boşaltma/boşaldılma

**detriment** ['detrɪmənt] *n* zərər, ziyan, itki; **to the ~ of *smth.*** bir şeyin zərərinə/ziyanına; *This tax cannot be introduced without detriment to the economy Bu verginin tətbiq edilməsi iqtisadiyyata ziyan vuracaq; He smoked a lot, to the detriment of his health O, çox papiros çəkirdi; bu da onun sağlamlığına ziyan vururdu*

**detrimental** [ˌdetrɪ'mentl] *adj* ziyanlı, xətərli, zərərli, ziyan/zərər verən; **activities ~ to our interests** bizim maraqlarımıza ziyan / zərər verən hərəkətlər; **~ to *one's* health** sağlamlıq üçün zərərli / ziyanlı



**detrimentally** [ˌdetrɪ'mentəlɪ] *adv* ziyanına, zərərinə, ziyanına/zərərinə olaraq; **to affect *smth.* ~** bir şeyə ziyanına/zərərinə işləmək

**de trop** [də'trou] *adj fr.* 1. çox, həddən artıq, olduqca, dedikcə, son dərəcə; 2. lazımsız, yersiz; mane olan, heç nəyə lazım olmayan; *Their intimate conversation made me feel distinctly de trop Onların intim/məhrəmanə söhbətləri mənə son dərəcə yersiz göründü*

**detruck** [dɪ'trʌk] *v amer.* 1. maşından düşürmək /boşaltmaq; 2. maşından düşmək

**deuce¹** [dju:s, du:s] *n* 1. iki, du *(zərdə və s.)*; **~ of hearts** ikilik qırmızıtoxmaq *(qumar kağızı)*; 2. eyni hesab *(tennisdə - 40:40)*

**deuce²** [dju:s] *int.* şeytan, iblis; *Deuce! Lənətə gələsən! Lənət sənə! The deuce knows Nə bilim, Bilmirəm, Go to the deuce Rədd ol! Rədd ol get!*

**deuced¹** [dju:st] *adj* lap çox, son dərəcə; *I'm in a deuced hurry Mən son dərəcə tələsirəm*

**deuced²** [dju:st] *adv* son dərəcə, olduqca, çox; **~ uncomfortable** son dərəcə/olduqca narahat

**deucedly** ['dju:sɪdlɪ] *adv* = **deuced²**

**Deutschmark** ['dɔɪtʃma:k] *n (qısa forması DM; alman pul vahidi)* alman markası

**devaluation** [ˌdɪ:vælju'eɪʃn] *n mal.* devalvasiya *(1. qiymətdən düşmüş kağız pulların tədavüldən götürülərək sabit kağız pulla əvəz edilməsi; 2. kağız pulların məzənnəsinin aşağı salınması)*

**devalue** ['dɪ:'vælju:] *v* 1. *mal.* devalvasiya etmək / keçirmək; **to ~ the dollar** dolları devalvasiya etmək; *Economists believe that the best solution is to devalue İqtisadçılar inanırlar ki, məsələnin ən yaxşı həlli devalvasiya keçirməkdir;* 2. azaltmaq, qiymətini / dəyərini aşağı salmaq, mənasını azaltmaq; *People must not devalue her achievement Adamlar onun nailiyyətinin dəyərini azaltmamalıdırlar; Let's not devalue his work unjustly Gəlin onun işinin əhəmiyyətini ədalətsizcəsinə azaltmayaq*

**devastate** ['devəsteɪt] *v* 1. viran/məhv etmək, dağıtmaq, xaraba qoymaq, bərbad etmək; **to ~ a town** şəhəri xaraba qoymaq/xarabazara çevirmək; *Bombs had devastated the town Bombalar şəhəri dağıtdı/viran etdi; Earthquake devastated the city Zəlzələ şəhəri xarabazara çevirdi / məhv etdi;* 2. *(əsasən məchulda işlənir)* dərdə salmaq, bərk kədərləndirmək; *She was devastated by her husband's death O, ərinin ölümündən bərk kədərləndi*

**devastating** ['devəsteɪtɪŋ] *adj* 1. dağıdıcı, məhvedici, viranedici, fəlakətli; **~ wars** dağıdıcı/məhvedici müharibələr; **~ storm** fəlakətli/dağıdıcı tufan; **~ criticism** məhvedici tənqid; **~ news** dəhşətli xəbər; 2. çox təsirli / effektiv / gözəl; *She looked with devastating effect O, çox gözəl görünürdü; You look devastating tonight, my dear Əzizim, sən bu axşam çox gözəl / cazibədar görünürsən*

**devastatingly** ['devəsteɪtɪŋlɪ] *adv* dağıdıcı/ məhvedici/viranedici bir surətdə; həddən artıq, olduqca

**devastation** [ˌdevə'steɪʃn] *n* dağıdılma, xaraba qoyulma; xaraba qoyma; viranə, viranəlik, xarabazarlıq; *The storm left scenes of utter devastation Tufan özündən sonra viranəlik mənzərələri qoyub getdi*

**develop** [dɪ'veləp] *v* 1. inkişaf etdirmək; təkmilləşdirmək; **to ~ *one's* business** işini inkişaf etdirmək; **to ~ *one's* memory** yaddaşını inkişaf etdirmək; 2. inkişaf etmək, böyümək; *The child is developing well Uşaq yaxşı böyüyür/inkişaf edir; The plot for the novel gradually developed in my mind Romanın süjeti mənim beynimdə tədricən inkişaf edirdi;* 3. aydınlaşdırmaq, çıxartmaq *(şəkli)*; **to ~ a photograph** şəkil çıxartmaq; *I think these photographs will look nice when they are developed Məncə, bu şəkillər çıxardılandan sonra qəşəng görünəcək;* 4. göstərmək, büruzə vermək; *He developed symptoms of fever Onda qızdırma simptomu/əlaməti göründü; He developed a strange habit Onda qəribə adət əmələ gəldi;* 5. izah/ şərh/bəyan etmək, anlatmaq, başa salmaq; **to ~ *one's* plans to an audience** planlarını dinləyicilərə izah/ şərh etmək; 6. təşkil etmək, yaratmaq; **to ~ a strong organization** güclü təşkilat yaratmaq; 7. istifadə etmək; *We must develop all the natural substances in our country which can make us rich Biz ölkəmizdə olan və bizi zənginləşdirə biləcək təbii sərvətlərin hamısından istifadə etməliyik*

**developed** [dɪ'veləpt] *adj* inkişaf etmiş; **a highly ~ system of agriculture** yüksək inkişaf etmiş kənd təsərrüfatı sistemi; **the ~ nations of the world** dünyanın inkişaf etmiş xalqları; **one of the less ~ countries** qismən az inkişaf etmiş ölkələrdən biri

**developer** [dɪ'veləpəʳ] *n* 1. inkişaf etdirən, böyüdən *(adam)*; 2. *fot.* aydınlaşdırıcı preparat, aydınlaşdırıcı maddə

**developing** [dɪ'veləpɪŋ] *adj* inkişaf edən/etməkdə olan; **a ~ country** inkişaf edən / etməkdə olan ölkə; **the ~ world** inkişaf edən dünya

**development** [dɪ'veləpmənt] *n* 1. inkişaf, inkişaf etmə / etdirmə, irəliləmə, tərəqqi; böyümə, boy atma; **stage of ~** inkişaf dövrü/mərhələsi; **the healthy ~ of children** uşaqların sağlam böyüməsi; **the ~ of a seed into a plant** toxumun böyüyüb bitki olması; **~ of a plant** bitkinin böyüməsi/inkişafı; **~ from boyhood to manhood** yaşa dolma, kişiləşmə; **extraordinary ~ of literature** ədəbiyyatın qeyri-adi inkişafı; **~ of civilization** sivilizasiyanın/mədəniyyətin inkişafı; 2. anlatma, şərh / izah etmə; şərh, izah; **~ of a plan** planın şərhi / izahı; 3. cərəyan, istiqamət; **a new ~ in literature** ədəbiyyatda yeni cərəyan / istiqamət

**developmental** [dɪˌveləp'mentl] *adj* böyüyən; in-

kişaf edən, inkişaf dövründə / prosesində olan; təkamül; ~ **age** yeniyetmə yaşı / dövrü

**deviate** ['di:vɪeɪt] *v* kənara çıxmaq, meyllənmək, sapmaq, uzaqlaşmaq; **to ~ from a path 1)** cığırdan kənara çıxmaq; **2)** qəbul olunmuş yoldan kənara çıxmaq; **to ~ to the south** cənubə/cənuba meyllənmək; **to ~ from a topic** mövzudan kənara çıxmaq; **to ~ from the truth** həqiqətdən uzaqlaşmaq; **to ~ from the subject under discussion** müzakirə edilən mövzudan kənara çıxmaq

**deviation** [ˌdi:vɪ'eɪʃn] *n* **1.** sapma, sapdırma; kənara çıxma, uzaqlaşma; ~ **from the original** orijinaldan kənara çıxma; ~ **from the truth** həqiqətdən uzaqlaşma; **2.** *astr. fiz.* deviasiya *(yaxında olan çoxlu dəmir kütləsinin təsiri nəticəsində kompas əqrəbinin meridian xəttindən kənara çıxması)*

**device** [dɪ'vaɪs] *n* **1.** sxem, plan, layihə; **happy ~** uğurlu plan; **to invent a ~** plan fikirləşmək; **2.** üsul, yol; **stylistic ~s** üslub vasitələri; **stale ~** köhnəlmiş / çeynənmiş üsul; **3.** hiyləgər/məkrli niyyət; **the ~s of the devil** şeytan əməli/oyunu / hiyləsi; **4.** qurğu, konstruksiya, mexanizm; cihaz; **safety ~** qoruyucu mexanizm; **labour-saving ~s** məişət cihazları; **nuclear ~** nüvə qurğusu; **5.** emblem, nişan, əlamət, rəmz;
◊ **to leave *smb.* to his own ~** bir kəsi öz ixtiyarına buraxmaq

**devil**[1] ['devl] *n* **1.** şeytan, iblis; **to sell *one's* soul to the ~** şeytana/iblisə satılmaq/ qulluq etmək; **to listen to the ~** şeytana qulaq asmaq; *The Devil tempted Adam and Eve İblis / Şeytan Adəm və Həvvanı tamahlandırıb yoldan çıxartdı;* **2.** məkrli, pis niyyətli adam; *He is the very devil O, əsl şeytandır / iblisdir;*
◊ *Go to the devil! Rədd ol!/olun!; Between the devil and the deep sea at. söz. Aşağı tüpürürsən saqqal, yuxarı tüpürürsən bığ*

**devil**[2] [devl] *v* **1.** kəskin/tünd ət və ya balıq xörəyi hazırlamaq/bişirmək; **2.** *amer. d.d.* cırnatmaq, özündən çıxarmaq, hövsələsini daraltmaq

**devilish**[1] ['devlɪʃ] *adj* **1.** müdhiş, çox pis / ağır; iblisanə, şeytani; **a ~ plan** müdhiş plan; ~ **cunning** iblisanə biclik; *Those devilish tricks of yours will get you into prison some day, young man! Cavan oğlan sən/siz bu iblisanə hərəkətlərinə/hərəkətlərinizə görə bir gün həbsxanaya düşəcəksən/düşəcəksiniz;* **2.** amansız, qəddar, çox pis

**devilish**[2] ['devlɪʃ] *adv* = **devilishly**

**devilishly** ['devlɪʃlɪ] *adv* **1.** çox, həddən artıq; çox ağır; *It was a devilishly hard work climbing the mountain Dağa dırmaşmaq çox ağır iş idi;* **2.** şeytancasına, ibliscəsinə, şeytan / iblis kimi; **to act ~** şeytancasına / ibliscəsinə hərəkət etmək

**devilishness** ['devlɪʃnɪs] *n* şeytanlıq, iblislik; şeytani / iblisanə hərəkət

**devilment** ['devlmənt] *n* **1.** şeytanlıq, dəcəllik; yaramazlıq; **2.** hiylə, kələk, fırıldaq, hoqqa; ədəbsizlik, nəzakətsizlik

**devilry** ['devlrɪ] *n* **1.** hiyləgərlik, xainlik, məkrlilik, iblislik, şeytanlıq; hiylə, məkr; kin, qəzəb, ədavət, qərəz; **2.** coşğun nəşə /əyləncə/şənlik; **3.** *zaraf.* nadinclik, dəcəllik, yaramazlıq, hoqqa, oyun, şuluqluq; hiylə, kələk

**devious** ['di:vɪəs] *adj* **1.** hiyləgər, kələkbaz, fəndgir, bic, qeyri-səmimi; ikiüzlü, səmimiyyətsiz; **a ~ lawyer** hiyləgər/kələkbaz/qeyri-səmimi vəkil; **a ~ person** qeyri-səmimi/ikiüzlü adam; **to be ~** hiyləyə/fırıldağa/bicliyə əl atmaq; **2.** dolama, dolanbac; ~ **road/path** dolama yol/cığır; *The main road was blocked, so we came by a rather devious route Əsas yol tıxaclanmışdı, buna görə biz dolama marşrutla gəldik;* **3.** uzaq; tənha, yalqız; ~ **coasts** uzaq sahillər

**deviously** ['di:vɪəslɪ] *adj* hiylə ilə, kələklə, hiyləbazlıqla, hiylə/kələk yolu ilə, bicliklə; qeyri-səmimi

**deviousness** ['di:vɪəsnɪs] *n* **1.** hiylə, kələk, hiyləbazlıq, kələkbazlıq, fırıldaq, fırıldaqçılıq; **2.** dolanbaclıq, dolamalıq

**devise**[1] [dɪ'vaɪz] *n hüq.* **1.** vəsiyyət; vəsiyyətnamə; **2.** vəsiyyət edilmiş əmlak; vəsiyyət edilmiş daşınmaz mülk/əmlak

**devise**[2] [dɪ'vaɪz] *v* **1.** düşünüb / fikirləşib tapmaq; fikirləşmək; icad etmək; hazırlamaq, işləyib hazırlamaq; **to ~ a plan of attack** hücumun planını hazırlamaq; **2.** *hüq.* daşınmaz mülkü vəsiyyət etmək

**devisee** [ˌdevɪ'zi:] *n* vəsiyyət üzrə daşınmaz mülkün çatacağı varis

**deviser** [dɪ'vaɪzəʳ] *n* ixtiraçı, icad edən

**devoid** [dɪ'vɔɪd] *adj* **(of)** məhrum edilmiş, məhrum; -sız, -siz, -suz, -süz; ~ **of pity** insafsız, amansız, rəhmsiz, mürvətsiz; ~ **of sense** düşüncəsiz; ~ **of fear** qorxusuz; ~ **of inhabitants** əhalisiz, əhalisi olmayan; **an argument ~ of logic** məntiqsiz arqument / sübut / dəlil

**devoir** ['devwɔ:] *n fr. adət. pl* nəzakətli hərəkət; **to pay / to do *one's* ~s to *smb.*** bir kəsə öz hörmətini izhar etmək / göstərmək, bir kəsin görüşünə getmək

**devolution** [ˌdi:və'lu:ʃn] *n* **1.** vermə, təhvil vermə; verilmə *(vəzifəni, səlahiyyəti və s.);* ~ **of authority** səlahiyyətin təhvil verilməsi; **2.** keçmə; ~ **of the crown** taxt-tacın vəliəhdə keçməsi

**devolve** [dɪ'vɔlv] *v* **1.** keçmək *(səlahiyyət, vəzifə və s.);* **to ~ power on *one's* representative** səlahiyyəti öz nümayəndəsinə vermək; *When president is ill his duties devolve upon the Vice-President Prezident xəstə olduqda, onun səlahiyyətləri vitse-prezidentə keçir;* **2.** vermək; **to ~ knowledge to *smb.*** bir kəsə bilik vermək; *More power is to be devolved to regional government Yerli hökumətə daha çox hakimiyyət verilməlidir;* **3.** keçmək *(irsən); The estate devolved to his son Malikanə onun oğluna keçdi / qaldı*



**devote** [dɪ'vout] *v* **1.** həsr etmək; **to ~ *one's* life to art** həyatını incəsənətə həsr etmək; **to ~ oneself** özünü həsr etmək; uymaq, könül bağlamaq, aludə olmaq; **to ~ oneself to amusements** əyləncələrə uymaq/aludə olmaq; **2.** məhkum/düçar etmək; **to ~ *smb.* to destruction** bir kəsi ölümə məhkum etmək

**devoted** [dɪ'voutɪd] *adj* **1.** sədaqətli, etibarlı, sadiq; **a ~ friend** sədaqətli / sadiq / etibarlı dost; **a ~ supporter** etibarlı / sədaqətli tərəfdar; *He is very devoted to his wife O, arvadına çox sədaqətlidir/sadiqdir;* **2.** mehriban, incəqəlbli, şəfqətli; **a ~ mother** mehriban / şəfqətli ana; **a ~ son** mehriban oğul; **a ~ father** mehriban ata; *She is devoted to her children O, uşaqlarına qarşı çox mehribandır;* **3.** uyan, aludə olan; aludə, bir şeylə həddindən artıq maraqlanan; həsr edən *(bir şeyə);* ~ **to sports** idmanla maraqlanan, özünü idmana həsr edən; **4.** məhkum/düçar edilmiş

**devotedly** [dɪ'voutɪdlɪ] *adv* sədaqətlə, məhəbbətlə, doğruluqla, fədakarcasına

**devotee** [ˌdevou'ti:] *n* **1.** azarkeş, tərəfdar; **to be a ~ of hockey** hokkey azarkeşi olmaq; **2.** sitayiş/pərəstiş edən, pərəstişkar, aşiq; **a ~ of football/music/jazz/fiction, *etc.*** futbol/musiqi/caz /bədii ədəbiyyat pərəstişkarı; **to be a ~ of *smb.* / *smth.*** bir kəsin / bir şeyin pərəstişkarı olmaq; **to be a ~ of Bach** Baxın pərəstişkarı olmaq; *I'm a devotee of Bach Mən Baxın pərəstişkarıyam; Every great artist has his devotees and enemies Hər bir böyük rəssamın pərəstişkarları və düşmənləri olur;* **3.** qatı dindar / mömin

**devotion** [dɪ'vouʃn] *n* **1.** sədaqət, sədaqətlilik, vəfa, vəfalılıq, doğruluq, bağlılıq, tərəfdarlıq; ~ **to the cause** işə hədsiz sədaqət/sədaqətlilik; **2.** mehribanlıq, istək; **a mother's ~ to her children** ananın uşaqlarına məhəbbəti / istəyi; **3.** aludəlik, vurğunluq; *His devotion to the job left him with little free time İşə aludə olduğundan onun boş vaxtı olmurdu;* **4.** *pl* ibadət; **a priest at his ~s** ibadət edən/ibadət üstündə olan keşiş

**devotional** [dɪ'vouʃənl] *adj* dini; dindar, mömin, zahid; ~ **literature** dini ədəbiyyat

**devotionalism** [dɪ'vouʃnəlɪzm] *n* dindarlıq, möminlik, zahidlik

**devotionalist** [dɪ'vouʃnəlɪst] *n* abid, mömin, dindar; yalançı mömin, riyakar

**devour** [dɪ'vauəʳ] *v* **1.** acgözlüklə yemək, aşırmaq; ötürmək, tələsik yemək; **to ~ *one's* dinner** naharını acgözlüklə yemək /aşırmaq; *In no time at all they had devoured the entire loaf Bir anda / Bir göz qırpımında onlar bütün kömbəni aşırdılar; The lion devoured its prey in no time Şir şikarını bir anda aşırdı;* **2.** *məc.* çox sürətlə oxumaq; yemək; **to ~ a novel** romanı sürətlə oxumaq; **to ~ *smb.* with *one's* eyes** bir kəsi gözlərilə yemək; **3.** uçurmaq, dağıtmaq, məhv etmək; *The fire devoured the house Yanğın evi məhv etdi;* **4.** *adət. məchulda:* parçalamaq, dağıtmaq; əzab/iztirab/əziyyət vermək, incitmək; **to ~ *one's* heart** özünü əldən salmaq, özünü üzmək; **~ed by anxiety** narahatlıqdan əzab/iztirab çəkən

**devouringly** [dɪ'vauərɪŋlɪ] *adv* acgözlüklə, acgözcəsinə; böyük maraqla / həvəslə / şövqlə; **to gaze ~ at *smb.*** bir kəsə acgözlüklə/böyük maraqla baxmaq, bir kəsi gözlərilə yemək

**devourment** [dɪ'vauəmənt] *n* **1.** yemə, aşırma; **2.** udma, ötürmə; **3.** dağıtma, uçurma, viran / xarab etmə, xarabaya çevirmə

**devout** [dɪ'vaut] *adj* **1.** dindar, zahid, mömin; dinçi; dini; **a ~ Muslim** dindar/mömin müsəlman; **2.** müqəddəs; səmimi, həqiqi; sədaqətli, mehriban; ciddi; ~ **wish** müqəddəs arzu; **a ~ hope** səmimi/ müqəddəs ümid

**devoutly** ['dɪvautlɪ] *adv* səmimiyyətlə, qətiyyətlə; qəlbdən, ürəkdən; *I devoutly hope he does come Mən ürəkdən inanıram ki, o hökmən gələcək*

**devoutness** [dɪ'vautnɪs] *n* dindarlıq, möminlik, zahidlik

**dew**[1] [dju:] *n* **1.** şeh; **wet with ~** şehdən nəm /yaş; *The grass was wet with dew Ot şehdən yaş olmuşdu;* **2.** *şair.* təzəlik; təmizlik; təravət; **the ~ of youth** gənclik təravəti; **3.** tər damcısı, göz yaşı

**dew**[2] [dju:] *v* islatmaq, yaş etmək, çiləmək, nəm etmək

**dewdrop** ['dju:drɔp] *n* şeh, şeh damlası / damcısı

**dew-fall** ['dju:fɔ:l] *n* **1.** şeh düşmə; **2.** axşam şehi

**dewy** ['dju:ɪ] *adj* **1.** şehli; şeh, şehlə örtülü; ~ **morning** şehli səhər; ~ **beads** şeh damcısı; **2.** nəm, yaş; yaşarmış, doluxmuş; parlayan; ~ **eyes** yaşarmış/doluxmuş gözlər; **3.** *şair.* təravətləndirici, canlandıran, qıvraqlaşdıran; ~ **sleep/ slumber** təravətləndirici yuxu

**dexterity** [deks'terɪtɪ] *n* **1.** cəldlik, zirəklik, çeviklik, diribaşlıq; **2.** bacarıq, məharət; qabiliyyət, ustalıq; ~ **at the pistol** tapançadan istifadə məharəti; ~ **in argument** mübahisə etmə qabiliyyəti / məharəti; **mental ~** əqli qabiliyyət; **verbal ~** danışıq qabiliyyəti/məharəti; **musical ~** musiqi qabiliyyəti / məharəti; **3.** sağ əlindən istifadə etmə adəti

**dexterous** ['dekstrəs] *adj* **1.** zirək, çevik, diribaş, cəld, fəndgir; ~ **hands** cəld/zirək əllər; ~ **fingers** mahir/çevik/cəld barmaqlar; **2.** fərasətli, zəkalı, fəhmli, ayıq, tez başa düşən; bacarıqlı, məharətli, qabiliyyətli; **to be ~ in business** işində məharətli / fərasətli / düşüncəli olmaq; **3.** mahir, usta; ~ **management** usta rəhbərlik; **4.** sağ əldən istifadə etməyə alışan

**dexterously** ['dekstərəslɪ] *adv* **1.** cəld, bacarıqla, məharətlə; **2.** mahiranə, ustalıqla, bacarıqla

**dexterousness** ['dekstərəsnɪs] *n* = **dexterity**

**di-** [dɪ-, daɪ-] *pref. Əsasən terminlərin düzəldilməsində istifadə olunur və Azərbaycan türkcə-*

*sində mürəkkəb sözlərin komponenti olan* **iki** *sözünə uyğun gəlir;* **diatomic** **ikiatomlu; dibasic ikiəsaslı; dichromatic ikirəngli** və s.

**diabetes** [ˌdaɪəˈbiːtiːz] *n tib.* diabet, şəkər xəstəliyi

**diabetic[1]** [ˌdaɪəˈbetɪk] *n* diabetik *(şəkər xəstəliyi olan adam); His father is diabetic Onun atası diabetdir;*

**diabetic[2]** [ˌdaɪəˈbetɪk] *adj* **1.** diabet; **a ~ problem** diabet problemi; **2.** diabet xəstəliyi olan adama yararlı; **a ~ diet** diabet xəstəliyi olanlar üçün pəhriz

**diabolic** [ˌdaɪəˈbɔlɪk] *adj* **1.** iblisanə, məkrli, şeytani; **~ ingenuity** iblisanə biclik; **a ~ plan** iblisanə/məkrli plan; **~ grin** məkrli təbəssüm; **~ arts** cadugərlik, sehrbazlıq; **2.** hirsli, acıqlı, qəzəbli, qeyzli, qəddar, vəhşicəsinə, kinli, qəddarcasına; **~ cruelty** vəhşicəsinə qəddarlıq; **3.** iyrənc, çox pis; **~ weather** iyrənc hava

**diabolical** [ˌdaɪəˈbɔlɪkəl] *adj* = **diabolic**

**diabolically** [ˌdaɪəˈbɔlɪkəlɪ] *adv* **1.** şeytancasına, iblisanə, məkrlə, hiylə ilə; **2.** rəhmsizcəsinə, amansızcasına, insafsızcasına, sərt, vəhşicəsinə, qəddarcasına; qeyzlə, acıqla, qəzəblə, hiddətlə, kinli-kinli, acıqlı-acıqlı

**diabolism** [daɪˈæbəlɪzm] *n* **1.** cadugərlik, sehrbazlıq, ovsunçuluq; **2.** satanizm *(şeytanpərəstlik, iblisə sitayiş);* **3.** mübtəlalıq, mübtəla olma, tutulma; dəlilik, cinlilik, özündən çıxma, qəzəblənmə

**diadem[1]** [ˈdaɪədem] *n* diadema; çutqabağı, başlıq *(qadınların başına qoyduqları tacşəkilli daşqaşlı bəzək),* tac, çələng, əklil; **~ of snow** *şair.* qar tacı / çələngi

**diadem[2]** [ˈdaɪədem] *v* tac/əklil/çələng qoymaq

**diagnoses** [ˌdaɪəgˈnousiːz] *n* **diagnosis** *isminin cəm forması*

**diagnosis** [ˌdaɪəgˈnousɪs] *n (pl* **-ses)** **1.** *tib.* diaqnoz *(xəstəliyi təyin etmə);* **to make (out)/to form a ~** diaqnoz qoymaq, diaqnozu təyin etmək; **accurate ~** dəqiq diaqnoz; *We are still waiting for the doctor's diagnosis Biz hələ də həkimin diaqnozunu gözləyirik;* **2.** dəqiq təyin etmə/qiymət vermə; **~ of a character** xarakteri dəqiq təyin / müəyyən etmə

**diagnostic** [ˌdaɪəgˈnɔstɪk] *adj tib.* diaqnostik; diaqnoz qoyma; **~ skill** diaqnoz qoyma məharəti/bacarığı; **symptoms that were of little ~ value** diaqnostik əhəmiyyəti az olan simptomlar /əlamətlər; *Your appearance and condition are diagnostic of yellow fever Sənin / Sizin görkəmin / görkəminiz və vəziyyətin / vəziyyətiniz sarılıq xəstəliyinin əlamətlərinə bənzəyir*

**diagnostically** [ˌdaɪəgˈnɔstɪkəlɪ] *adv* diaqnoz vasitəsilə / yolu ilə, diaqnoz qoyma vasitəsilə, diaqnozun köməyilə

**diagnostics** [ˌdaɪəgˈnɔstɪks] *n* diaqnostika *(diaqnoz qoyma üsulları haqqında elm)*

**diagonal[1]** [daɪˈægənl] *n riyaz.* diaqonal *(çoxbucaqlının və ya çoxüzlünün yanaşı olmayan tərəflərini birləşdirən düz xətt)*

**diagonal[2]** [daɪˈægənl] *adj* **1.** diaqonal; **~ lines** diaqonal xətlər; **2.** çəp, çəpinə, çəpəki, çəpinə xətləri olan; **~ cloth** çəpinə xətti / zolağı olan parça

**diagonally** [daɪˈægənəlɪ] *adv* diaqonal üzrə / boyunca

**diagram[1]** [ˈdaɪəgræm] *n* **1.** diaqram *(müxtəlif kəmiyyətlər arasındakı nisbəti göstərən qrafik təsvir);* **to present** *smth.* **by a ~** bir şeyi diaqram vasitəsilə təqdim etmək/ təsvir etmək; **2.** sxem; **~ of blood circulation** qan dövranının sxemi; **a ~ of a rail network** dəmiryol qovşağının sxemi

**diagram[2]** [ˈdaɪəgræm] *v* diaqram tərtib etmək

**diagrammatic** [ˌdaɪəgrəˈmætɪk] *adj* sxematik; sxematik/ümumi şəkildə; **a ~ map** sxematik xəritə

**diagrammatical** [ˌdaɪəgrəˈmætɪkəl] *adj* = **diagrammatic**

**diagrammatically** [ˌdaɪəgrəˈmætɪkəlɪ] *adv* sxematik olaraq /surətdə /tərzdə, sxematik şəkildə

**dial[1]** [ˈdaɪəl] *n* **1.** siferblat *(saat və digər ölçü cihazları üzərində rəqəmlər olan lövhəcik);* **2.** disk *(dairəşəkilli lövhə: televizorda və s.);* **3.** dağ kompası; **4.** limb *(bucaqölçən cihazlarda dərəcələrə bölünmüş dairə)*

**dial[2]** [ˈdaɪəl] *v* **1.** rəqəmlərlə bölmək; **2.** ölçmək; **3.** yığmaq *(telefon nömrəsini);* zəng etmək; *Dial the number! Telefon nömrəsini yığ!/yığın!;* **to ~ the police station** polis məntəqəsinə zəng etmək / vurmaq; **4.** köklənmək, sazlamaq; qurmaq, tutmaq *(televizor, radio və s.)*

**dialect** [ˈdaɪəlekt] *n dilç.* **1.** dialekt *(yerli şivə);* **local ~** yerli / məhəlli dialekt; **the London ~** London dialekti; **a play written in ~** dialektdə yazılmış pyes; **peasant ~** kəndli dialekti/nitqi; **2.** dil *(dil ailəsinin üzvü kimi)*

**dialectal** [ˌdaɪəˈlektl] *adj dilç.* dialekt; **~ differences** dialekt fərqləri; **~ words** dialekt sözləri; dialektalizm *(ədəbi dildə işlənən bir yerli dialektə aid söz və ifadə)*

**dialectic[1]** [ˌdaɪəˈlektɪk] *n* **1.** dialektika; **2.** mübahisə /polemika apara bilmək bacarığı; **3.** dialektik *(dialektik fəlsəfə tərəfdarı)*

**dialectic[2]** [ˌdaɪəˈlektɪk] *adj* **1.** dialektik; **~ materialism** dialektik materializm; **2.** mübahisə etməyə meylli

**dialectical** [ˌdaɪəˈlektɪkəl] *adj* dialektik; **~ method** dialektik metod

**dialectologist** [ˌdaɪəlekˈtɔlədʒɪst] *n* dialektoloq *(dialektologiya mütəxəssisi)*

**dialectology** [ˌdaɪəlekˈtɔlədʒɪ] *n dilç.* dialektologiya *(dilşünaslığın dialektləri öyrənən şöbəsi)*

**dialogue** [ˈdaɪəlɔg] *n* dialoq *(iki şəxs arasında gedən söhbət), mükalimə;* **a long/a short ~** uzun/qısa dialoq; müsahibə, söhbət; **spirited ~** canlı /qızğın müsahibə; **a constructive ~ on common problems** ümumi problemlər üzrə



konstruktiv söhbət; *More dialogue between world leaders is needed Dünya rəhbərləri arasında daha çox dialoqa / söhbətə ehtiyac var*

**diameter** [daɪˈæmɪtəʳ] *n* **1.** diametr *(çevrənin mərkəzindən keçib onu iki bərabər hissəyə ayıran düz xətt);* **the ~ of a tree-trunk** ağac gövdəsinin diametri; *Measure the diameter of this circle Bu dairənin diametrini ölç / ölçün;* **2.** linzanın böyütmə qabiliyyətini ölçmək üçün vahid; **to magnify two thousand ~s** iki min dəfə böyütmək; *This glass magnifies 20 diameters Bu şüşə 20 dəfə böyüdür*

**diametral** [daɪˈæmɪtrəl] *adj* **1.** diametral; **2.** tam, tamam, diametral

**diametric** [ˌdaɪəˈmetrɪk] *adj* **1.** diametrə aid olan, diametral; köndələn; **2.** tam əks olan; tam, tamam

**diametrical** [ˌdaɪəˈmetrɪkəl] *adj* = **diametric**

**diametrically** [ˌdaɪəˈmetrɪkəlɪ] *adv* diametral; tamamilə, tamam, büsbütün, daban-dabana; **to hold ~ opposite views** daban-dabana zidd fikirlərdə olmaq; *They hold diametrically opposite views Onlar daban-dabana zidd fikirdədirlər*

**diamond[1]** [ˈdaɪəmənd] *n* **1.** almaz, brilyant; **black ~** qara almaz / brilyant; **black ~s** *şair.* daş kömür; **rough ~ in the rough** cilalanmamış almaz; **2.** almaz *(şüşə kəsmək üçün alət);* **3.** *riyaz.* romb *(tərəfləri bərabər olan çəp paraleloqram);* **4.** *amer.* beysbol meydançası;

◊ **~ cut ~** bir-birinə layiq rəqib; ≅ *Pazı pazla çıxararlar*

**diamond[2]** [ˈdaɪəmənd] *adj* **1.** brilyant; **a ~ ring** brilyant üzük; **a ~ necklace** brilyant boyunbağı; **2.** almaz, almazdan düzəldilmiş/qayrılmış; **~ tool** *tex.* almazdan düzəldilmiş alət; **~ bed** almaz yatağı; **~ mine/field** almaz mədəni; **3.** taraşlı, taraş edilmiş, rombşəkilli; **~ fret** rombşəkilli bəzək;

◊ **~ anniversary/jubilee** altmışillik yubiley; **~ wedding** toyun altmışillik ildönümü; brilyant toy

**diamond[3]** [ˈdaɪəmənd] *v* brilyantla bəzəmək

**diamond-bearing** [ˈdaɪəmənd.beərɪŋ] *adj* tərkibində almaz olan

**diamond-shaped** [ˈdaɪəməndˈʃeɪpt] *adj* romboidşəkilli, romboidlərdən ibarət olan

**Diana** [daɪˈænə] *n* **1.** *(Roma əsatirində)* Diana; **2.** *şair.* ay, qəmər

**diapasm** [ˈdaɪəpæzm] *n* kirşan, ətirli toz

**diapason** [ˌdaɪəˈpeɪsn] *n* diapazon *(1.) mus. müğənni və ya musiqi alətinin çıxara biləcəyi səsin genişlik dərəcəsi; 2.) məc. həcm, miqdar, dairə, dərəcə)*

**diaper[1]** [ˈdaɪəpəʳ] *n* **1.** naxışlı/bəzəkli / güllü parça *(süfrə, məhrəba və s. tikmək üçün);* **2.** naxışlı/bəzəkli/ güllü məhrəba; **3.** əski, bələk; **4.** rombşəkilli naxış / bəzək

**diaper[2]** [ˈdaɪəpəʳ] *v* **1.** rombşəkilli naxış / bəzək vurmaq; **2.** bələmək, bələkləmək; qundaqlamaq *(uşağı)*

**diaphanous** [daɪˈæfənəs] *adj* yüngül, nazik, çox zərif *(parça haq.);* **a ~ veil** nazik / çox zərif duvaq

**diaphragm** [ˈdaɪəfræm] *n* **1.** *anat.* diafraqma *(döş boşluğunu qarın boşluğundan ayıran əzələ/pərdə);* **2.** *fiz.* diafraqma *(fotoaparat və s. optik cihazlarda daxil olan işıq şüalarını düzəldib çoxaltmaq üçün dairəşəkilli pərdəcik);* **3.** *tex.* pərdə, membran

**diarize** [ˈdaɪəraɪz] *v* gündəlikdə qeyd etmək; gündəlik tutmaq

**diarrhoea** [ˌdaɪəˈrɪə] *n tib.* ishal; *d.d.* qarın işləməsi; **to have a bad attack of ~** bərk ishala tutulmaq

**diary** [ˈdaɪərɪ] *n* **1.** gündəlik; **to keep a ~** gündəlik tutmaq; *Do you keep a diary? Sən/Siz gündəlik tutursanmı / tutursunuzmu? Old diaries tell us much about social history Köhnə gündəliklər bizə ictimai tarix haqda çox şey deyir;* **2.** qeyd üçün kitabça-təqvim

**diaspora** [daɪˈæspərə] *n* diaspora *(hər hansı bir xalqın, xüs. yəhudilərin dünyanın müxtəlif ölkələrinə yayılması)*

**dice[1]** [daɪs] *n* zər; **a pair of ~** bir cüt zər; **to throw the ~** zər atmaq

**dice[2]** [daɪs] *v* I **1.** zər atmaq; **2. (away)** uduzmaq; **to ~ away all** *one's* **money** bütün pullarını uduzmaq

**dice** [daɪs] *v* II **1.** kubik şəklində doğramaq /kəsmək *(pendiri, əti, xiyarı və s.);* **2.** kubik və ya kvadrat şəklində bəzək vurmaq / tikmək;

◊ **to ~ with death** həyatını təhlükəyə atmaq ≅ ölümlə çilingağac oynamaq

**dicey** [daɪsɪ] *adj* **(dicier, diciest)** qorxulu, təhlükəli, xətərli, xatalı

**dichotomy** [daɪˈkɔtəmɪ] *n* dixotomiya *(ardıcıl surətdə ikiyə bölmə);* **the ~ between good and evil** xeyirlə şər arasında dixotomiya

**dickens** [ˈdɪkɪnz] *n* şeytan, iblis; **to go to the ~** dağılmaq, məhv olmaq; **to play the ~ with** *smth.* hər şeyi korlamaq

**dicky** [ˈdɪkɪ] *adj* **(dickier, dickiest)** **1.** zəif, xəstə, naxoş, nasaz; **to have a ~ heart** ürəyi zəif/xəstə olmaq; **2.** heç nəyə yaramayan/gərək olmayan, çox köhnəlmiş; əldən düşmüş; **a ~ old man** əldən düşmüş qoca

**dictaphone** [ˈdɪktəfoun] *n* diktafon *(danışığı yazan aparat)*

**dictate[1]** [ˈdɪkteɪt] *n* əmr etmə/vermə; sərəncam, hökm; tələb; **the ~s of the taste** zövqün hökmü / tələbi; **the ~s of reason** əqlin tələbi / hökmü; **to follow the ~s of** *one's* **heart** qəlbinin hökmünə münasib hərəkət etmək/tabe olmaq

**dictate[2]** [dɪkˈteɪt] *v* **1.** diktə etmək, imla yazdırmaq; **to ~ a letter** məktubu diktə etmək/deyib yazdırmaq; *He dictated the letter to his secretary O, məktubu katibəsinə diktə etdi; The teacher dictated a passage to the class Müəllim bir parça mətni sinfə diktə etdi;* **2.** zorla qəbul et-

dirmək; tələb/şərt qoymaq; **to ~ terms to a defeated enemy** məğlub olmuş düşmən qarşısında şərt qoymaq; **to ~ to** ***smb.*** bir kəsə əmr / diktə etmək; *You can't dictate people how they should live Sən/Siz insanların necə yaşamalı olmalarını diktə edə bilməzsən/bilməzsiniz;* 3. təyin etmək, müəyyənləşdirmək *(bir şeyi); The size of the building is dictated by the strength of the foundation Binanın ölçüsü onun özülünün gücü ilə müəyyənləşdirilir*

**dictation** [dɪk'teɪʃn] *n* 1. imla, diktant; **to take ~, to write from ~** diktə ilə yazmaq; 2. əmr, diktə, göstəriş; hökm, buyruq; fərman; **to write at** ***smb.'s*** **~** bir kəsin diktəsi ilə yazmaq; **at** ***smb.'s*** **~** bir kəsin göstərişilə/əmrilə / hökmü ilə; **to take ~, to yield to ~** əmrə/fərmana tabe olmaq

**dictator** [dɪk'teɪtə'] *n* diktator; *Our boss is a real dictator Bizim boss əsl diktatordur*

**dictatorate** [dɪk'teɪtərɪt] *n* diktatorluq, diktator hakimiyyəti

**dictatorial** [ˌdɪktə'tɔ:rɪəl] *adj* 1. diktator; **~ government / powers** diktator hökuməti / hakimiyyəti; 2. ədalı, amiranə; **~ tone** amiranə ton; **~ manner** amiranə davranış

**dictatorially** [ˌdɪktə'tɔ:rɪəlɪ] *adv* diktator kimi; amiranəliklə, amiranə bir tərzdə / surətdə, ədalı-ədalı

**dictatorship** [dɪk'teɪtəʃɪp] *n* diktatura; **the ~ of the proletariat** proletariatın diktaturası

**diction** ['dɪkʃn] *n* 1. ifadə/danışıq tərzi, söz seçmə; **the ~ of poetry** poeziya dili, poetik dil; **the simple ~ of his poetry** onun poeziyasının sadə dili; 2. diksiya *(tələffüzün, ifadənin aydınlıq dərəcəsi)*; **clarity of ~** diksiyanın aydınlığı; *Clarity of diction is vital for an orator Natiq üçün diksiyanın aydınlığı çox vacibdir*

**dictionary** ['dɪkʃənrɪ:] *n* lüğət; sözlük; **an English ~** ingilis dili lüğəti; **an Azerbaijani-English ~** Azərbaycanca-ingiliscə lüğət

**dictum** ['dɪktəm] *n (pl* **dicta** *və ya* **dictums)** 1. kəlam; həkimanə söz; 2. mötəbər bəyanat; nüfuzlu rəy, hökm; 3. *hüq.* hakimin rəyi / fikri

**did** [dɪd] **to do** *felinin pt forması*

**didactic** [dɪ'dæktɪk] *adj* didaktik, nəsihətedici, nəsihətverici, öyüdverici; ibrətli, ibrətamiz; əxlaqi; **~ literature** didaktik ədəbiyyat; **~ methods** didaktik metodlar / üsullar

**didactically** [dɪ'dæktɪkəlɪ] *adv* didaktik bir surətdə; ibrətamiz / nəsihətverici bir tərzdə, əxlaqi baxımdan

**didacticism** [dɪ'dæktɪsɪzm] *n* didaktizm, didaktik, nəsihətçilik

**didactics** [dɪ'dæktɪks] *n* didaktika *(pedaqogikanın təlim üsullarından bəhs edən şöbəsi)*

**diddle** ['dɪdl] *v d.d.* 1. aldatmaq, tovlamaq, kələk /fırıldaq gəlmək; **to ~** ***smb.*** **out of his money** bir kəsi aldadıb/tovlayıb pulunu *(əlindən)* almaq; 2. məhv/xarab/ tələf etmək; öldürmək; 3. (away) mənasız/boş yerə itirmək/sərf etmək; **to ~ away** ***one's*** **time** vaxtını boş / havayı yerə itirmək

**diddle-daddle** ['dɪdl'dædl] *n d.d.* cəfəngiyyat, axmaq/mənasız/boş söz, boş/mənasız şey

**diddler** ['dɪdlə'] *n d.d.* fırıldaqçı, hiyləgər, dələduz, adamaldadan, kələkbaz, cüvəllağı

**didn't** ['dɪdnt] **did not**-*un qısa danışıq forması*

**dido** ['daɪdoʊ] *n (pl* **-es** [-oʊz]) *d.d.* dəcəllik, şuluqluq, hoqqa; nadinclik, yaramazlıq; **to cut (up) ~es** gic-gic zarafat / şitlik etmək; dəcəllik /nadinclik etmək

**die**[1] [daɪ] *n* 1. *(pl* **dice)** zər *(zərlərdən biri)*; 2. risk; uğur, müvəffəqiyyət; 3. kubik; **to cut** ***smth.*** **into ~** bir şeyi kubik şəklində kəsmək; 4. *tex.* kubik şəklində hissə; 5. çəkməçi bıçağı;

◊ **as smooth as a ~** ≅ mərmər kimi sığallı; **as straight as a ~** ox kimi düz; *The die is cast / thrown Olan olub, keçən keçib*

**die**[2] [daɪ] *v* 1. ölmək; **to ~ of hunger** acından ölmək; **to ~ of age** qocalıqdan ölmək; **to ~ of cancer** xərçəngdən ölmək; **to ~ by violence** əldə ölmək; **to ~ by an enemy's hand** düşmən əlində ölmək; **to ~ from / of wounds** yaradan ölmək; **to ~ on the scaffold** edam kürsüsündə ölmək; **to ~ at the stake** tonqalda yandırılaraq ölmək; **to ~ in battle** vuruşda / döyüşdə ölmək; **to ~ in poverty** yoxsulluq içərisində ölmək; **to ~ a beggar** dilənçi kimi ölmək; **to ~ a hero's death** igid/qəhrəman kimi ölmək; **to ~ a natural death** öz əcəlilə ölmək; **to ~ an early death** vaxtsız ölmək; **to ~ the death** edam edilmək; 2. *məc.* ölmək, əldən getmək; **to ~ of/ with laughter/laughing** gülməkdən ölmək / əldən getmək; **to ~ with curiosity** maraqdan əldən getmək, çox maraqlanmaq; **to ~ of boredom** qüssədən ölmək; 3. yox/qeyb olmaq; *The smile died on her lips Təbəssüm onun dodaqlarında qeyb oldu; The secret died with him Sirr onunla birgə qəbrə getdi; Great deeds cannot die Böyük işlər ölməz olur, Böyük işlər unudulmur;* 4. ölüşkəmək, qurumaq *(bitki haq.)*; **to ~ from lack of care** baxımsızlıq ucbatından qurumaq; 5. marağı itirmək, laqeyd olmaq; **to ~ to the world** həyata marağı itirmək; 6. *d.d.* çox/bərk istəmək, əldən getmək, həsrətində olmaq; *She is dying to learn the secret Sirri öyrənmək üçün o, əldən gedir; He is dying for a drink O susuzluqdan ölür; He is dying to see you O səni/sizi çox görmək istəyir;* 7. dayanmaq; sönmək, səsi kəsilmək; *The motor died Motor söndü; Her heart died within her Onun sinəsində ürəyi dayandı;* **to ~ away** 1) ürəyi getmək, huşunu itirmək; 2.) zəifləmək, kəsilmək, dayanmaq *(səs, külək haq.)*; **to ~ down** yox olmaq, yoxa çıxmaq; sakitləşmək; **to ~ off** 1) bir-birinin dalınca ölmək; 2) sakitləşmək; *The debate died off Mübahisə sakitləşdi;* **to ~ out** qurtarmaq, yoxa çıxmaq; *The candle died out Şam yanıb qurtardı;*

◊ **to ~ game** kişi kimi ölmək, mübarizədə ölmək; **to ~ dunghill** qorxaq kimi ölmək; **to ~ hard** 1) ölümlə mübarizə aparmaq; ölümə can verməmək; 2) ciddi mübarizə aparmaq; **to ~ in** ***one's*** **bed** öz əcəlilə ölmək; *A man can die but once Kişi bir dəfə ölər;* ≅ *Ölmək ölməkdir, bəs xırıldamaq nə deməkdir;* **to ~ like flies** milçək kimi qırılmaq

**diet**[1] ['daɪət] *n* 1. qida, yeyəcək, xörək; yemək; **frugal ~** kasıb/yararsız yemək; **meat ~, ~ of meat** ət xörəkləri/yeməkləri; **the Japanese ~ of rice, vegetables and fish** yaponların düyü, tərəvəz və balıq xörəkləri/yeməkləri; **illness caused by poor ~** pis/yararsız yemək nəticəsində törəyən xəstəlik; **liquid/heavy ~** sulu/ağır xörək; 2. pəhriz; yemək rejimi; **strict / rigid ~** möhkəm pəhriz; **to keep/to take (a) ~, to go on a ~** pəhriz saxlamaq; *The doctor has told me to go on a diet Həkim mənə pəhriz saxlamağı deyib;* **to put** ***smb.*** **to/ on a ~** bir kəsə pəhriz təyin etmək; *The doctor put me to /on a diet Həkim mənə pəhriz təyin etdi;* **saltfree / sugarfree ~** duzsuz / şəkərsiz pəhriz

**diet**[2] ['daɪət] *v* 1. pəhriz təyin etmək; **to ~** ***smb.*** **rigorously** bir kəsə ciddi pəhriz təyin etmək; **to ~ oneself** pəhriz saxlamaq, pəhrizini gözləmək; 2. yemək rejimi təyin etmək; yeməyin miqdarını müəyyənləşdirmək; 3. yemək, qida qəbul etmək

**dietary** ['daɪətərɪ] *adj* pəhriz; **~ foods** pəhriz yeməkləri; **~ advice** pəhriz məsləhəti; **~ habits** pəhriz adətləri; **~ requirements** pəhriz tələbləri

**diet-bread** ['daɪət'bred] *n* pəhriz çörəyi

**dieter** ['daɪətə'] *n* pəhriz saxlayan *(adam)*

**dietetic**[1] [ˌdaɪɪ'tetɪk] *n* diyeta/pəhriz üzrə mütəxəssis

**dietetic**[2] [ˌdaɪɪ'tetɪk] *adj* diyetetik, pəhriz; **~ therapy** diyetoterapiya *(pəhriz vasitəsilə müalicə)*

**dietetics** [ˌdaɪɪ'tetɪks] *n* diyetetika *(diyeta elmi)*

**dietist** ['daɪɪtɪst] *n* dietoloq, pəhriz həkimi

**dietician** [ˌdaɪɪ'tɪʃn] *n* = **dietist**

**diet-kitchen** ['daɪət'kɪtʃɪn] *n* pəhriz mətbəxi

**differ** ['dɪfə'] *v* 1. fərqlənmək, ayrılmaq, seçilmək; fərqləndirmək, ayırd etmək, seçmək; **to ~ from each other** bir-birindən fərqlənmək; **to ~ in appearance** xaricən bir-birindən fərqlənmək, oxşar olmamaq; *English differs from French İngilis dili fransız dilindən fərqlənir;* 2. razılaşmamaq, başqa-başqa fikirdə olmaq; **to ~ from/with** ***smb.*** bir kəslə razılaşmamaq, bir kəslə başqa-başqa fikirdə olmaq; *I have to differ with you on that Mən bu işdə səninlə/sizinlə razılaşmıram;*

◊ *Tastes differ at. söz.* ≅ *Zövqlər müxtəlif olur*

**difference**[1] ['dɪfrəns] *n* 1. fərq, təfavüt, ayrılıq, bənzərsizlik, bənzəməmə; **~ in appearance /character** xarici görünüşdə / xasiyyətdə bənzərsizlik; **~ of opinion** fikirlərdə fərq /ayrılıq; *There's not much difference in price between the two cars Bu iki maşının qiyməti arasında elə çox fərq yoxdur, There are marked differences between the two children Bu iki uşaq arasında nəzərə çarpacaq fərq var;* **to tell the ~** fərqini demək, fərqlənlirmək; *It's easy to tell the difference between butter and margarine Kərə yağını marqarindən fərqləndirmək asandır;* **to make a ~** fərq etmək; *The sea air has made a big difference to her health Dəniz havası onun səhhətinə çox böyük fərq edib;* 2. *riyaz.* fərq; 3. narazılıq, mübahisə, didişmə; **to have a ~ with** ***smb.*** bir kəslə didişmək / mübahisə etmək; **to settle the ~** mübahisəni/narazılığı yoluna qoymaq; *Why don't you settle your differences and be friends again? Siz nə üçün mübahisəni qurtarıb, yenidən dost olmursunuz?*

◊ **to spilt the ~** kompromisə getmək

**difference**[2] ['dɪfrəns] *v* 1. fərqləndirmək, ayırd etmək, ayırmaq; 2. *riyaz.* fərqini hesablamaq

**different** ['dɪfrənt] *adj* 1. cürbəcür, müxtəlif, çeşidli, ayrı-ayrı, başqa-başqa; **in ~ ways** cürbəcür yollarla; **a lot of ~ things** çoxlu cürbəcür/çeşidli şeylər; **to be ~ from other people** başqa adamlardan fərqli olmaq/seçilmək; *Their tastes are widely different Onların zövqü tamamilə müxtəlifdir;* **at ~ times** müxtəlif vaxtlarda/zamanlarda; 2. başqa, özgə, qeyri, digər; *I feel a different man now Mən özümü indi başqa adam hiss edirəm; That's different Bu başqa məsələ; He's a different kind of man O tamamilə başqa/özgə cür adamdır*

**differential**[1] [ˌdɪfə'renʃl] *n* 1. bir şeyin kəmiyyəti/miqdarı arasında olan fərq, xüsusən pul və haqq arasında; **tax ~s** vergi fərqləri; **price ~s** qiymət fərqləri; **a dispute about the ~ between men and women workers** kişi və qadın fəhlələrin əmək haqqlarının fərqi haqqında mübahisə; 2. *riyaz.* diferensial *(funksiya artımının bir hissəsi)*; 3. *tex.* diferensial *(maşınların hərəkət edən hissələrinə müxtəlif sürət, istiqamət verən mexanizm)*; 4. *d.y. müxtəlif marşrutla gedən qatarlarda eyni yer üçün satılan biletlərin qiyməti arasındakı fərq*

**differential**[2] [ˌdɪfə'renʃl] *adj* 1. fərqləndirici, fərqlənmə; **~ peculiarity** fərqləndirici xüsusiyyət; **~ characteristic** fərqləndirici xasiyyət; 2. diferensial; **~ diagnosis** diferensial diaqnoz; **~ tariff** diferensial tarif; **~ equation** *riyaz.* diferensial tənlik

**differentiate** [ˌdɪfə'renʃɪeɪt] *v* 1. fərqləndirmək, fərq/ təfavüt qoymaq, ayırd etmək; ayırmaq, sərhəd qoymaq; **to ~ prose from poetry** nəsri poeziyadan fərqləndirmək/ayırmaq; *I can't differentiate (between) these 2 flowers Mən bu iki gülü fərqləndirə/ayırd edə bilmirəm;* 2. fərqlənmək, ayrılmaq; *Languages become differen-*

*tiated Dillər fərqlənir;* 3. *riyaz.* diferensialını tapmaq

**differentiation** [ˌdɪfərenʃɪ'eɪʃn] *n* 1. fərqləndirmə, fərqini tapma, sərhəd / hədd qoyma; ~ **of / between cause and effect** səbəb və nəticəni fərqləndirmək; 2. bölmə, bölünmə; ixtisaslaşdırma, ixtisaslaşma; ~ **of labour** əməyin bölünməsi; 3. *riyaz.* diferensiallaşma, tərkib hissələrinə ayırma / ayrılma

**difficult** ['dɪfɪkəlt] *adj* 1. çətin, zor; zəhmətli, əziyyətli; **a ~ problem/language /translation /question,** *etc.* çətin problem/dil/tərcümə/məsələ və s. *This mountain is difficult to climb, It is difficult to climb this mountain Bu dağa dırmaşmaq çətindir /zordur; It's difficult to imagine Təsəvvür etmək çətindir;* 2. çətin, ağır, müşkül, höcət; bədrəftar, yola getməyən; **a ~ child** çətin/bədrəftar uşaq; ~ **disposition** ağır xasiyyət; *He is difficult to please Onu razı salmaq müşkül məsələdir*

**difficulty** ['dɪfɪkəltɪ] *n* 1. çətinlik; **financial ~** maliyyə çətinliyi; **the difficulties of English Syntax** ingilis sintaksisinin çətinlikləri; **with ~** çətinliklə; **to do** *smth.* **with ~** bir şeyi çətinliklə etmək; *She got the door open, but with difficulty O, qapını açdı, lakin çətinliklə;* **without ~** çətinliksiz, asanlıqla; *We found the house without difficulty Biz evi asanlıqla/çətinlik çəkmədən tapdıq;* **to lead to ~** çətinlik yaratmaq; *Bad planning will lead to difficulty later Pis planlaşdırma sonralar çətinlik yaradar;* **to meet/to face with difficulties** çətinliklərlə qarşılaşmaq /üzləşmək; **to overcome every ~** hər bir çətinliyin öhdəsindən gəlmək; **to make / to raise ~** çətinlik yaratmaq; 2. *amer. adət. pl* mübahisə, münaqişə, ixtilaf

**diffidence** ['dɪfɪdəns] *n* 1. özünə inamı olmama, ürəksizlik, cəsarətsizlik, ağciyərlik, qorxaqlıq, utancaqlıq; *She overcame her natural diffidence and spoke with great frankness O özünə xas olan utancaqlığa üstün gəldi və çox səmimi danışdı;* **with ~** tərəddüdlə, inamsızlıqla; 2. inamsızlıq, etimadsızlıq, etibarsızlıq

**diffident** ['dɪfɪdənt] *adj* ürəksiz; utancaq, özünə inamı olmayan; cəsarətsiz; **an able but ~ young student** bacarıqlı, lakin özünə inamı olmayan gənc tələbə

**diffidently** ['dɪfɪdəntlɪ] *adv* cəsarətsiz, inamsız, utana-utana, çəkinə-çəkinə; **to speak ~** utana-utana/çəkinə-çəkinə danışmaq

**diffract** [dɪ'frækt] *v fiz.* şüaları parçalamaq / sındırmaq

**diffraction** [dɪ'frækʃn] *n fiz.* şüa sınması

**diffuse**[1] [dɪ'fjuz] *adj* 1. dağınıq, yayılmış, səpələnmiş *(işıq və s. haq.); Direct light is better for reading than diffuse light Oxumaq üçün dağınıq işıqdan düz düşən işıq daha yaxşıdır;* 2. *kim., fiz.* diffuz; qarışmış, diffuziya nəticəsində əmələ gəlmiş; 3. yayğın; *The evidence is too diffuse Sübut / Əsas çox yayğındır;* 4. uzunçu, uzun, uzundanışan; ~ **writer** uzunçu yazıçı; 5. boşboğaz, naqqal, çərənçi, çoxdanışan

**diffuse**[2] [dɪ'fju:z] *v* 1. yaymaq *(həm də məc.);* **to ~ learning** bilik yaymaq; 2. yayılmaq *(həm də məc.); The drop of blood diffused in the bowl of water, which became pink Qan damlası qabdakı suda yayıldı və su çəhrayı rəngə boyandı;* 3. sərf etmək, israf etmək, dağıtmaq; itirmək; **to ~ one's strength** qüvvəsini israf etmək; 4. dağıtmaq, yaymaq, şüalandırmaq; **to ~ heat** istilik buraxmaq/yaymaq; 5. diffuziya yolu ilə qarışmaq/girmək *(qaz, maye və s.)*

**diffused** [dɪ'fju:zd] *adj* 1. yayılmış, səpələnmiş; ~ **opinion** yayılmış fikir/rəy; 2. dağınıq; ~ **light** dağınıq işıq

**diffusely** [dɪ'fju:zlɪ] *adv* dağınıq halda; yayğıncasına, səpələnmiş tərzdə

**diffuseness** [dɪ'fju:znɪs] *n* dağınıqlıq, yayğınlıq

**diffusible** [dɪ'fju:zəbl] *adj* 1. yayıla / səpələnə bilən; 2. yayılma / səpələnmə qabiliyyətinə malik

**diffusion** [dɪ'fju:ʒn] *n* 1. yayma, intişar; yayılma, intişar etdirmə *(həm də məc.);* ~ **of knowledge** bilik yayma; 2. uzunçuluq, sözçülük; yayğınlıq, aydın olmama, qeyri-müəyyənlik; 3. *fiz.* diffuziya *(molekulyar hərəkət nəticəsində maddələrin qarışması)*

**diffusive** [dɪ'fju:sɪv] *adj* 1. yayılan, yayıla bilən; 2. uzun, uzunçu, uzun danışan; 3. *fiz.* diffuz; qarışmış, diffuziya nəticəsində əmələ gəlmiş

**dig**[1] [dɪg] *n* 1. *d.d.* dürtmə, yumruq; dümsük, təpik; **to give** *smb.* **a ~ with his elbow** dirsəyi ilə bir kəsə dümsük/ dürtmə vurmaq; 2. *d.d.* istehza, rişxənd, lağa qoyma; acı/toxunan/kəskin söz, acılama, sancma; **to give** *smb.* **a ~, to get a ~ at** *smb.* bir kəsə istehza/ rişxənd etmək, bir kəsi lağa/masqaraya qoymaq; 3. *amer. d.d.* çalışqan tələbə; 4. qazma, qazıb çıxarma; 5. *dial.* toxa, kərki; bel

**dig**[2] [dɪg] *v (-gg-; pt, pp* **dug** [dʌg]) 1. qazmaq; eşələmək; **to ~ the ground** torpağı/yeri qazmaq; **to ~ a hole/a trench/ a well** çala/arx/quyu qazmaq; **to ~ for gold** qazıb qızıl axtarmaq; 2. çıxartmaq, qazıb çıxartmaq *(həm də* **to ~ out, to ~ up**); **to ~ potatoes** kartof çıxarmaq; 3. **(into, under, through)** qazmaq; qazıb yol/deşik açmaq; **to ~ through a mountain** dağın altından tunel qazmaq; 4. əldə etmək; **to ~ out/up new facts** yeni dəlillər əldə etmək; 5. **(in, into)** sancmaq, batırmaq, soxmaq; **to ~ spurs into a horse** atı mahmızlamaq; **to ~ one's hands into one's pockets** əllərini ciblərinə soxmaq; 6. itələmək, dürtmələmək; **to ~ smb. in the side** bir kəsi böyründən dürtmələmək; 7. batmaq, sancılmaq, soxulmaq; hopmaq; girmək *(alət və s. haq.);* 8. *tex.* pərçim olmaq, ilişmək; 9. *ovç.* qaldırmaq, yuvasından qaçırmaq *(heyvanı, quşu);* **to ~ out a fox/a badger** tülkünü/porsuğu yuvasından qaçırmaq; 10. *jarq.* başa düşmək, anlamaq, başı çıxmaq; dərk etmək; *Do you dig me? Məni başa düşürsən?/düşürsünüz? Before we could dig what was going on, they started shooting Biz ətrafda nə baş verdiyini anlayana kimi, onlar atəş açmağa başladılar; I don't dig foreign money Mənim xarici pullardan başım çıxmır;* 11. *jarq.* baxmaq *(tamaşaya),* qulaq asmaq *(musiqiyə);* **to ~ a performance** tamaşaya baxmaq; **to ~ in** sancmaq, batırmaq, soxmaq; **to ~ in the spurs** mahmızı batırmaq, mahmızlamaq;

◊ **to ~ a pit for** *smb.* bir kəsə quyu qazmaq; **to ~ in one's heels** möhkəmlənmək, vəziyyətini möhkəmlətmək; **to ~ up the hatchet** müharibə başlamaq

**digamist** ['dɪgəmɪst] *n* ikinci dəfə kəbin kəsdirən adam

**digamous** ['dɪgəməs] *adj* ikinci dəfə evlənən

**digest**[1] ['daɪdʒest] *n* 1. xülasə; nəticə; **a ~ of the week's news** həftənin xəbərlərinin xülasəsi; 2. məlumat/sorğu/arayış kitabçası

**digest**[2] [daɪ'dʒest] *v* 1. həzm etmək *(qidanı);* həzm olunmaq; *Tom can't digest fat Tom piyi həzm edə bilmir; məc. His rudeness is hard to digest Onun kobudluğunu həzm etmək çətindir; həzm olunmaq; Cheese doesn't digest easily Pendir asanlıqla həzm olunmur; Some foods take long to digest Bəzi qidalar gec həzm olunur;* 2. mənimsəmək, qavramaq, başa düşmək; **to ~ the lesson** dərsi mənimsəmək/ başa düşmək; **to ~ the contents of a book** kitabın məzmununu başa düşmək/qavramaq; 3. dözmək, qəbul etmək, udmaq; **to ~ an insult** təhqirə dözmək, təhqiri udmaq; *This is more than I can digest Mən buna dözə bilmərəm;* 4. qısaca və ardıcıl olaraq ifadə etmək; sistemləşdirmək

**digestibility** [daɪˌdʒestə'bɪlɪtɪ] *n* 1. tez / yüngül həzm olunma; 2. *məc.* asanlıqla başa düşülmə / dərk edilmə

**digestible** [daɪ'dʒestəbl] *adj* 1. tez həzm olunan, yüngül; ~ **food** tez həzm olunan/ yüngül qida; 2. asanlıqla/tez başa düşülən

**digestion** [daɪ'dʒestʃn] *n* 1. həzm, həzm etmə; **easy/hard of ~** asan/çətin həzm etmə; *Drink tea with your meal as an aid to digestion Həzmə kömək üçün yeməyin üstündən çay için;* 2. mənimsəmə, başa düşmə, dərk etmə *(biliyi və s.)*

**digestive** [daɪ'dʒestɪv] *adj* 1. həzm, həzm etmə; **the ~ process** həzm / həzm etmə prosesi; ~ **system** həzm etmə orqanları sistemi; ~ **tract** həzm borusu; ~ **trouble** mədənin pozulması; 2. həzmə/həzm etməyə kömək edən, həzmi asanlaşdıran / yüngülləşdirən

**digger** ['dɪgəʳ] *n* 1. yerqazan; 2. yerqazan maşın; 3. qızılaxtaran, qızılçıxaran

**digit** ['dɪdʒɪt] *n* 1. barmaq *(xüs. heyvanlarda);* 2. *riyaz.* rəqəm; *The number 57306 contains five digits 57306 sayında beş rəqəm var*

**digital** ['dɪdʒɪtl] *adj* 1. barmağa aid olan; 2. barmağabənzər, barmağaoxşar, barmaqşəkilli; 3. rəqəmli; ~ **computer** rəqəmli hesablayıcı maşın; ~ **clock** rəqəmli saat *(yəni vaxtı əqrəblə deyil, rəqəmlə göstərən saat)*

**dignified** ['dɪgnɪfaɪd] *adj* 1. şəxsi ləyaqəti olan; məğrur, qürurlu, təkəbbürlü, lovğa; **a ~ person** məğrur / qürurlu / təkəbbürlü adam; **a ~ manner** qürurlu / təkəbbürlü davranış; **a ~ silence** qürurlu / məğrur sakitlik; **an old ~ man** məğrur /qürurlu qoca kişi; **to have ~ manners** özünü məğrur / qürurlu aparmaq; **to assume a ~ air** özünü məğrur/qürurlu/təkəbbürlü göstərmək; 2. hündür, uca, yüksək

**dignify** ['dɪgnɪfaɪ] *v* 1. tərifləmək, yüksəltmək, həddindən artıq şişirtmək/tərifləmək, göylərə qaldırmaq; 2. cinsini yaxşılaşdırmaq, cinsləşdirmək *(heyvan, bitki haq.);* 3. hörmətə mindirmək, şərəfləndirmək, ad vermək; *He dignifies a small shop with the name of stores O, balaca mağazaya univermaq adı verməklə onu hörmətə mindirir; The ceremony was dignified by the presence of the ambassador Səfirin iştirakı mərasimi şərəfləndirdi*

**dignitary**[1] ['dɪgnɪtərɪ] *n* 1. əyan, yüksək mənsəb sahibi; 2. prelat *(katolik kilsəsində yüksək ruhani vəzifəsindən birinin adı)*

**dignitary**[2] ['dɪgnɪtərɪ] *adj* 1. əsilzadə, əsil-nəsilli; 2. yüksək mənsəb / rütbə sahibi olan; 3. *məc.* möhtərəm, hörmətli

**dignity** ['dɪgnɪtɪ] *n* 1. ləyaqət, heysiyyət, mənlik; **to be beneath** *smb.'s* ~ bir kəsin ləyaqətindən aşağı olmaq, bir kəsin ləyaqətinə sığmamaq; *It's beneath my dignity Bu mənim ləyaqətimə sığmır; Some husbands still think it beneath their dignity to do shopping Bəzi ərlər hələ də bazarlıq etməyi öz ləyaqətlərinə sığışdırmırlar;* **with ~** ləyaqətlə; **to do smth. with ~** bir şeyi ləyaqətlə etmək; *Only a truly free person has human dignity Əsl mənada azad insanın ləyaqəti/heysiyyəti olur; He always acted with dignity O həmişə ləyaqətlə hərəkət edirdi;* **to stand on/upon** *one's* ~ özünü ləyaqətlə aparmaq, özünə hörmət qoymaq; özünə hörmət tələb etmək; *She never stands on her dignity with those who work for her, but treats them as friends and colleagues O heç vaxt onun üçün işləyən adamlardan özünə qarşı hörmət tələb etmir, əksinə onlara dost və həmkar kimi münasibət göstərir;* 2. əzəmət, böyüklük; vüqar; **the ~ of labour** əməyin böyüklüyü; 3. yüksək mənsəbli / mənsəb sahibi olan adam; 4. yüksək mənsəb / vəzifə / titul; 5. *pl top.* i yüksək mənsəb / vəzifə sahibləri

**digress** ['daɪgres] *v* kənara çıxmaq, yayınmaq *(mövzudan və s.); He always digress from his theme while speaking Danışanda o həmişə mövzudan kənara çıxır/yayınır;* **to ~ into/on a subject** başqa mövzuya keçmək

**digression** [daɪ'greʃn] *n* **1.** kənara çıxma, uzaqlaşma *(mövzudan və s.)*; **2.** haşiyə çıxma, ricət; *The book can be enjoyed for its digressions Kitab ricətlərinə görə adamın xoşuna gələ bilər*

**digressional** [daɪ'greʃənl] *adj* = **digressive**

**digressive** [daɪ'gresɪv] *adj* kənara çıxan, geri duran, yayınan *(mövzudan və s.)*

**dike**[1] [daɪk] *n* **1.** axma, axım; nov, novça; qanov, ensiz arx, xəndək; kanal; **2.** damba, torpaq bənd / təpəsi; **3.** *məc.* sədd; əngəl, maneə, çətinlik; **4.** torpaq və ya daş hasar / barı / çəpər

**dike**[2] [daɪk] *v* **1.** damba ilə/bəndlə müdafiə etmək; **2.** damba/bənd çəkmək; **3.** ətrafını qazmaq; ətrafına kanal çəkmək; **4.** qurutmaq, drenaj üsulu ilə qurutmaq *(bataqlığı)*

**dilapidate** [dɪ'læpɪdeɪt] *v* **1.** dağıtmaq, yıxmaq, uçurmaq, viran etmək; dağılmaq, uçmaq, viran /bərbad/yox/puç/məhv olmaq; **2.** xərcləmək, sərf/israf etmək, dağıtmaq

**dilapidated** [dɪ'læpɪdeɪtɪd] *adj* **1.** köhnə, çox köhnəlmiş; dağılmış; yarımdağılmış, yarımsökülmüş, yarımxaraba; ~ **house** köhnə/yarımdağılmış/yarımsökülmüş/dağılmış ev; **a ~ bed** köhnə/çox köhnəlmiş çarpayı; **a ~ chair** köhnə/çox köhnəlmiş stul; **a ~ car** köhnəlmiş maşın; **2.** xərclənmiş, dağıdılmış *(var-dövlət)*; **3.** pinti/ səliqəsiz geyinmiş; dağılmış, əzilmiş *(paltar və s. haq.)*, cırılmış, tikə-tikə edilmiş

**dilapidation** [dɪ.læpɪ'deɪʃn] *n* **1.** köhnəlmə, xarab olma, yararsız hala düşmə/ gəlmə; **2.** köhnəlik, qədimlik; yarımdağılmış / yarımuçmuş vəziyyət; **to be in a state of ~** yarımuçmuş vəziyyətdə olmaq; **3.** *hüq.* zədə, zərər; zərər vurma, ziyan vermə; **to pay for ~s** ziyanı / zərəri ödəmək

**dilate** [daɪ'leɪt] *v* **1.** genəltmək, enlətmək; genişləndirmək; **2.** genişlənmək, genəlmək; *Her eyes dilated with terror Onun gözləri dəhşətdən genişləndi; The pupils of our eyes dilate when we enter a dark room Qaranlıq otağa girərkən bizim gözlərimizin bəbəyi genişlənir;* **3.** müfəssəl / ətraflı danışmaq, uzatmaq; **to ~ on / upon** *smth.* bir şeydən müfəssəl/ətraflı danışmaq

**dilated** [daɪ'leɪtɪd] *adj* genişlənmiş, geniş; genişləndirilmiş

**dilation** [daɪ'leɪʃn] *n* genişlənmə; enlənmə; genişləndirmə, genəltmə

**dilatory** ['dɪlətərɪ:, -tɔ:rɪ] *adj* **1.** uzadan, süründürən, ləngidən; süründürməçilik; ~ **policy** süründürməçilik siyasəti; ~ **actions** süründürməçilik hərəkətləri; **2.** ağır, ağırtərpənən, ləng, astagəl, yavaş *(adam haq.)*; ~ **movement** yavaş / ləng hərəkət; ~ **servant** ağırtərpənən / astagəl qarabaş

**dilemma** [dɪ'lemə, daɪ-] *n* dilemma *(iki mümkün və xoşagəlməz qərardan birini məcburən qəbul etmə)*; **to be in a ~** dilemma qarşısında qalmaq; **to face a ~** dilemma ilə üzləşmək / qarşılaşmaq; *He was in a dilemma as to whether to stay at school or get a job O, dilemma qarşısında qalmışdı, oxusun, yaxud işləsin;*

◊ **on the horns of a ~** seçim məcburiyyəti

**dilettante**[1] [.dɪlɪ'tæntɪ] *n (pl* **dilettanti** [-tɪ:] *və ya* **dilletantes**) diletant, həvəskar *(hər hansı bilik sahəsində səthi məlumatı olan adam)*

**dilettante**[2] [.dɪlɪ'tæntɪ] *adj* diletant, həvəskar; **a ~ artist** həvəskar rəssam; **a ~ composer** həvəskar bəstəçi / bəstəkar

**dilettantism** [.dɪlɪ'tæntɪzm] *n* diletantlıq, dilettantizm

**diligence** ['dɪlɪdʒəns] *n* I səy, cəhd, çalışqanlıq, çalışma, cidd-cəhd; **to show ~** səy /cəhd göstərmək; *She shows great diligence in her study O oxumağa çox böyük səy / cəhd göstərir*

**diligence** ['dɪlɪʒa:ns] *n* II dilican *(keçmişdə dördtəkərli minik arabası)*

**diligent** ['dɪlɪdʒənt] *adj* **1.** çalışqan, cidd-cəhd göstərən; **a ~ pupil** çalışqan şagird; **a ~ worker** çalışqan fəhlə; *He is a diligent worker and deserves more pay O, çalışqan işçidir və yüksək maaş almağa layiqdir;* **2.** yorulmayan; çox diqqətli, çox zəhmət və səbr tələb edən; *The letter was found after a diligent search in the files Çox diqqətli axtarışdan sonra məktub qovluğa tikilmiş kağızların içindən tapıldı*

**diligently** ['dɪlɪdʒəntlɪ] *adv* səylə, cəhdlə, çalışqanlıqla, cidd-cəhdlə; **to work ~** səylə işləmək

**dill** [dɪl] *n bot.* şüyüd

**dilly-dally** ['dɪlɪ'dælɪ] *v d.d.* uzatmaq, ləngitmək, tərəddüd etmək; *Stop dilly-dallying and make up your mind Uzatma/uzatmayın, bir qərara gəl/gəlin*

**diluent**[1] ['dɪljuənt] *n kim.* sıyıqlaşdırıcı, durulaşdırıcı *(maye)*, əridici, həlledici

**diluent**[2] ['dɪljuənt] *adj* **1.** həll edilmiş, əridilmiş *(suda və s.)*; qatılmış, qarışdırılmış *(su və s. qatmaqla)*; durulaşdırılmış, sıyıqlaşdırılmış; **2.** zəif, zəiflədilmiş; gücdən / taqətdən salınmış

**dilute** [daɪ'lju:t] *v* **1.** durulaşdırmaq; qatmaq *(su və s. ilə)*, sıyıqlaşdırmaq, durulaşdırmaq; həll etmək, əritmək; **to ~ wine** şəraba/çaxıra su qatmaq; **to ~ gases** qazları seyrəklətmək; **2.** zəifləmək; zəiflətmək

**dilution** [daɪ'lu:ʃn] *n* **1.** sıyıqlaşdırma, sıyıqlaşma, durulaşdırma, durulaşma; qarışdırma, qatma *(su və s.)*; *They charged him with unlawful dilution of the beer Onlar onu pivəyə qeyri-qanuni su qatmaqda təqsirləndirdilər;* **2.** məhlul; **3.** zəifləmə, zəiflətmə, zəifləşdirmə; *Critics see this as a further dilution of the party's policy Tənqidçilər bunu partiyanın siyasətinin daha da zəifləməsi hesab edirlər*

**dim**[1] [dɪm] *adj (müq. dər.:* **dimmer**; *üst. dər.:* **dimmest**) **1.** tutqun; zəif, ölgün; solğun *(işıq haq.)*; ~ **candle** zəif yanan şam; ~ **light** zəif / sönük işıq; *The light is too dim for me to read*



*Mənim oxumağım üçün işıq çox zəifdir;* **2.** pis/ zəif işıqlandırılmış; ~ **room** pis/zəif işıqlandırılmış otaq; **3.** donuq, dumanlı, anlaşılmaz, dolaşıq; qeyri-müəyyən; *The old man's eyesight was dim Qoca kişinin gözləri zəif görürdü; His eyesight is getting dim Onun gözləri getdikcə zəif görür; Her eyes were dim with tears Yaş onun gözlərini dumanlaşdırdı;* **4.** anlaşılmaz, qeyri-müəyyən, tutqun, dumanlı; ~ **idea** anlaşılmaz fikir; ~ **remembrance** dumanlı xatirə; **5.** gic, axmaq, səfeh; **a ~ sort of joke** axmaq/səfeh zarafat; *He is pretty dim O əməlli-başlı gicdir/axmaqdır;*

◊ **to take a ~ view of** *smth.* bir şeydən yaxşı heç nə gözləməmək, bir şeyə şübhə ilə yanaşmaq; *He took a dim view of my suggestion O mənim təklifimə şübhə ilə yanaşdı*

**dim**[2] [dɪm] *v (pt, pp* **dimmed**) **1.** dumanlandırmaq, tutqunlaşdırmaq, pərdələmək; zəiflətmək *(işığını)*; şəffaflığını zəiflətmək; *The stage lights (were) dimmed as the curtain rose Pərdə qalxanda səhnənin işıqları zəiflədi;* **to ~ a mirror** güzgünü tutqunlaşdırmaq; *Her eyes were dimmed with tears Onun gözləri göz yaşlarından dumanlandı;* **2.** zəifləmək, dumanlanmaq, şəffaflığını itirmək; *The light of a candle is dimmed by that of the sun Şamın işığı günəş işığında zəifləyir;* **3.** kütləşdirmək, zəiflətmək; **to ~ feelings** hissləri kütləşdirmək; *Old age hasn't dimmed his memory Qocalıq onun yaddaşını kütləşdirməyib / zəifləytməyib*

**dime** [daɪm] *n amer.* 10 sent dəyəri olan pul vahidi

**dimension**[1] [dɪ'menʃn] *n pl* **1.** ölçü, əndazə; böyüklük; **of considerable ~s** çox böyük ölçülər; **to take the ~s of** *smth.* bir şeyin ölçüsünü götürmək, bir şeyi ölçmək; *What are the dimensions of the room? Otağın ölçüsü nə qədərdir? (yəni eni, uzunu, hündürlüyü və s.); A line has one dimension and a square has 2 dimensions Xəttin bir, kvadratın isə iki ölçüsü var;* **2.** *riyaz.* ölçü; **fourth ~** dördüncü ölçü; **of two ~s** ikiölçülü

**dimension**[2] [dɪ'menʃn] *v* ölçüsünü vermək / yazmaq

**dimensional** [dɪ'menʃənl] *adj* ölçülü, ölçüsü olan; *A square is two-dimensional and a cube is three-dimensional Kvadrat ikiölçülü, kub isə üçölçülüdür*

**dimensionless** [dɪ'menʃənlɪs] *adj* **1.** ölçüsüz, ölçüsü olmayan; **2.** ölçüyə gəlməyən, çox nəhəng

**diminish** [dɪ'mɪnɪʃ] *v* **1.** azaltmaq, kiçiltmək, əskiltmək; aşağı salmaq; qısaltmaq; zəiflətmək; **to ~ pressure** təzyiqi azaltmaq/aşağı salmaq; **to ~ suspicions** şübhələri azaltmaq; *His illness diminished his strength Xəstəliyi onun qüvvəsini zəiflətdi;* **2.** azalmaq, kiçilmək, əskilmək, zəifləmək; **to ~ in bulk** həcmcə azalmaq / kiçilmək; **3.** *amer.* hörmətdən/qiymətdən salmaq; mənasını azaltmaq; *The opposition is trying to diminish our achievement Müxalifət bizim nailiyyətlərimizi qiymətdən salmağa çalışır*

**diminishable** [dɪ'mɪnɪʃəbl] *adj* qısala/kiçilə / azala / gödələ bilən

**diminished** [dɪ'mɪnɪʃt] *adj* qısaldılmış, azaldılmış, gödəldilmiş

**diminution** [.dɪmɪ'nju:ʃn] *n* azalma; azaldılma, azaltma; əskildilmə, əskilmə; qısaltma, qısalma; ~ **in** *smth.* bir şeyin azalması/əskilməsi; **to show ~** azalmaq, əskilmək, qısalmaq; sona çatmaq; *We are hoping for a small diminution in taxes Biz vergilərin bir az azalmasına ümid edirik*

**diminutive**[1] [dɪ'mɪnjutɪv] *n* **1.** balaca/kiçicik şey; **2.** zəif/tabsız/taqətsiz/üzgün/əldən düşmüş adam

**diminutive**[2] [dɪ'mɪnjutɪv] *adj* **1.** kiçildici, kiçiltmə; **a ~ suffix** kiçiltmə suffiksi; **2.** balaca, bambalaca, kiçicik; *The dog is so diminutive that it can be carried in the pocket İt elə bambalacadır ki, onu cibdə gəzdirmək olar*

**dimly** ['dɪmlɪ] *adv* tutqun, donuq

**dimmer** ['dɪmə<sup></sup>] *n el.* reostat *(elektrik cərəyanının şiddətini və onun gərginliyini nizama salan cihaz)*

**dimness** ['dɪmnɪs] *n* donuqluq, tutqunluq, qeyri-şəffaflıq; sönüklük

**dimple**[1] ['dɪmpl] *n* **1.** zənəxdan, batıq *(xüs. yanaqda və ya çənədə)*; **2.** çuxur, çökək, çala; **3.** zərif dalğa/qırış/ləpə *(suyun üzündə)*

**dimple**[2] ['dɪmpl] *v* **1.** zərif dalğa/ləpə ilə örtmək; **2.** görünmək, peyda olmaq *(batıq haq. yanaqda və s.)*

**dimpled** ['dɪmpld] *adj* batığı olan, batıqlı; ~ **cheeks** batığı olan / batıqlı yanaqlar

**dim-sighted** ['dɪm'saɪtɪd] *adj* **1.** zəif/pis görən; yaxıngörən, uzağı görməyən; **2.** *məc.* fərasətsiz, bəsirətsiz, gələcəyi görməyən /görə bilməyən; ~ **politicians** gələcəyi görə bilməyən /görməyən siyasətçilər

**dim-witted** ['dɪm'wɪtɪd] *adj* küt, korazehin, anlamaz, qanmaz, fəhmsiz; məhdud, dar düşüncəli, uzağı görməyən

**din**[1] [dɪn] *n* səs, səs-küy, qalmaqal, tap-tup; **the ~ of a big city** böyük şəhərin səs-küyü/qalmaqalı; **to make/to kick up a ~** səs-küy/qalmaqal salmaq / qaldırmaq

**din**[2] [dɪn] *v (-nn-)* **1.** səs/səs-küy/qalmaqal salmaq, səs-küy/qalmaqal qaldırmaq; **2.** əl çəkmədən/həyasızcasına təkrar etmək; **to ~ *smth.* into *smb.*'s ears/head** bir şeyi bir kəsin qulağına/başına doldurmaq; *These rules were dinned into my head when I was at school Mən məktəbdə oxuyarkən bu qaydaları beynimə yeritmişdilər;* **3.** qulağında cingildəmək

**dinar** ['dɪ:na:] *n* dinar *(bir sıra Yaxın Şərq və Şimali Afrika ölkələrində işlənən pul vahidi)*

**dine** [daɪn] *v* **1.** nahar etmək; *Don't talk about business while we're dining Biz nahar edəndə*

*işdən danışma/danışmayın;* **to ~ late** gec nahar etmək; **to ~ with** *smb.* bir kəslə nahar etmək; **to ~ on / upon/off** *smth.* naharda nəsə yemək; **2.** nahar vermək, qonaq etmək; **3.** tutmaq, yerləşmək *(nahar edənlər haq.)*: *This table/room dines twelve comfortably Bu stolda/otaqda on iki adam rahatca nahar edə bilər*

**diner** ['daınər] *n* **1.** nahar edən; nahara dəvət olunan qonaq; **2.** vaqon-restoran

**diner-out** ['daınər'aut] *n* evdə nahar etməyən adam; *He is a regular diner-out O həmişə bayırda nahar edir*

**ding[1]** [dıŋ] *n* zəng səsi; zınqıltı; cingilti

**ding[2]** [dıŋ] *v* **1.** dınqıldatmaq, zınqıldatmaq; cingildətmək; dınqıldamaq, cingildəmək, zınqıldamaq; **to ~ in** *one's* **ears** qulağında cingildəmək; **2.** beyninə yeritmək, qulağını doldurmaq; *He dinged it into my ears O bu barədə məni dəng etdi*

**ding-dong[1]** ['dıŋ'dɔŋ] *n* **1.** zəng səsi, dınqıltı; **2.** yeknəsəq təkrar etmə

**ding-dong[2]** ['dıŋ'dɔŋ] *adj* **1.** dınqıldayan, cınqıldayan; cingiltili; **2.** yeknəsəq/usandırıcı bir şəkildə təkrar olunan / edilən

**ding-dong[3]** ['dıŋdɔŋ] *adv* çox həvəslə, cəhdlə, qızğın surətdə/tərzdə, cidd-cəhdlə, ciddi, ciddi olaraq; **to set to work ~** işə ciddi / həvəslə / cidd-cəhdlə girişmək

**ding-dong[4]** ['dıŋ'dɔŋ] *v* cingildəmək, zınqıldamaq, dınqıldamaq

**dingle-dangle[1]** ['dıŋgl'dæŋgl] *n* **1.** irəli-geri yellənmə; **2.** irəli-geri yellənən şey

**dingle-dangle[2]** ['dıŋgl'dæŋgl] *adj* yellənən *(o yan bu yana)*

**dingle-dangle[3]** ['dıŋgl'dæŋgl] *adv* o yan, bu yana yellənərək

**dingo** ['dıŋgou] *n (pl* **-oes** [-ouz] *zool.* dinqo *(Avstraliyada vəhşi it)*

**dingy** ['dındʒı] *adj* **1.** tutqun; rəngi qaçmış, solğun, saralmış, donuq; bozarmış; **~ sky** tutqun səma; **~ wall-paper** bozarmış/rəngi qaçmış/saralmış divar kağızı; **2.** çirkli və qaranlıq, ürək açmayan, ürəksıxıcı, cansıxıcı; **a ~ room in a cheap hotel** ucuz mehmanxanada çirkli və qaranlıq/cansıxıcı otaq; **a ~ manufacturing town** çirkli və cansıxıcı sənaye şəhəri; **a ~ street** çirkli və qaranlıq küçə; **3.** pis geymiş, nimdaş paltar geymiş; **4.** şübhəli, nöqsanlı, nöqsansız olmayan *(ad, san, şöhrət və s. haq.)*

**dingily** ['dındʒılı] *adv* nimdaş, pis, köhnə; *She was dingily dressed O, nimdaş geyinmişdi*

**dinginess** ['dındʒınıs] *n* köhnəlik, nimdaşlıq; tutqunluq, solğunluq

**dining-car** ['daınıŋka:r] *n* vaqon-restoran

**dining-hall** ['daınıŋhɔ:l] *n* yeməkxana *(məktəbdə və s.)*

**dining-room** ['daınıŋru:m] *n* yemək otağı *(mənzildə)*

**dining-table** ['daınıŋ.teıbl] *n* yemək stolu

**dinky** ['dıŋkı] *adj d.d.* **1.** gözəl, qəşəng, yaraşıqlı, bəzəkli, zərif *(paltar, papaq və s. haq.)*; **a ~ little hat** balaca qəşəng /gözəl/ yaraşıqlı papaq; **2.** balaca, xırdaca, kiçik, kiçicik; **a ~ room** balaca/kiçicik otaq; *This room is too dinky for me Bu otaq mənim üçün çox balacadır/ kiçikdir*

**dinner** ['dınər] *n* nahar *(günorta yeməyi)*; **formal ~** rəsmi nahar/ziyafət; **to be at ~** nahar etməkdə olmaq; *Don't telephone John while he's at dinner Nahar edərkən Cona telefon etmə / etməyin;* **to have / to take ~** nahar etmək; **to give a ~** nahar vermək; **to ask** *smb.* **to ~** bir kəsi nahara dəvət etmək; *Shall we ask him to dinner Biz onu nahara dəvət edəkmi?; It's time for dinner Nahar vaxtıdır; When's dinner-time? Nahar vaxtı haçandır? Have you had dinner yet? Sən/Siz hələ nahar etməmisən/etməmisiniz?* **a three-course ~** üç növ xörəkdən ibarət nahar; *The prime minister attended a dinner given in his honour Baş nazir onun şərəfinə verilən naharda iştirak etdi; Dinner's ready Nahar hazırdır;*
◊ **~ without grace** kəbinə qədər cinsi əlaqədə olma

**dinner-hour** ['dınər'auər] *n* **1.** nahar vaxtı; **2.** nahar fasiləsi

**dinner-table** ['dınə.teıbl] *n* nahar stolu

**dinner-time** ['dınətaım] *n* = **dinner-hour**

**dinosaur** ['daınəsɔ:r] *n* dinozavr

**dint[1]** [dınt] *n* batıq, əzik; batıq yer; çuxur, çala; iz, yer, nişanə; **a deep ~** dərin batıq/əzik/batıq/çuxur;
◊ **by ~ of** vasitəsilə; *He reached the top by dint of great effort O, zirvəyə zorla/ güclə qalxdı*

**dint[2]** [dınt] *v* əzmək, əzik / batıq etmək; iz qoymaq / buraxmaq

**dip[1]** [dıp] *n* **1.** salma, salınma, batırma, batma, dalma; cumma, baş vurma *(suya)*; **the ~ of oars** avarların batması *(suya)*; **2.** *d.d.* çimmə; çimdirmə; **to go for a ~** çimməyə getmək; **to have/to take a ~** çimmək; *Shall we have a dip before breakfast? Səhər yeməyindən əvvəl çiməkmi?;* **to give** *smb.* **a ~** bir kəsi çimdirmək; **3.** *məc.* baxma, nəzər salma; nəzərdən keçirmə; **to have a ~ in / into a book** kitaba nəzər salmaq; **4.** çökək, batıq, çuxur; **~ in the ground** yerdə çuxur/çökək; **~ in the road** yolda çökək/çuxur; **~ among the hills** təpələr arasında çökək/çuxur; **5.** eniş, meyl; yamac, döş; **6.** sous, xörək şirəsi

**dip[2]** [dıp] *v* **(-pp-) 1.** salmaq, batırmaq, soxmaq, basmaq *(suya və s.)*; **to ~** *one's* **fingers in the water** barmaqlarını suya salmaq/soxmaq; **to ~ a pen in/into the ink** qələmi mürəkkəbə batırmaq; *Dip your pen into the ink Qələmini/Qələminizi mürəkkəbə batır/batırın;* **2.** batmaq, cummaq; **to ~ in/into the water** suya batmaq /cummaq; **3.** ötəri baxmaq/nəzər salmaq; **to ~ into a book** kitaba ötəri nəzər salmaq; *I've only*



*had time to dip into the book Mənim kitaba ancaq ötəri baxmağa vaxtım oldu;* **4.** enmək; meyllənmək; *The sun dipped (down) below the horizon Günəş üfüqün arxasına endi;* **5.** endirmək, aşağı salmaq; **to ~ the sail** yelkəni aşağı salmaq / endirmək; **to ~ the colours** bayrağı endirmək; **6.** əyilmək *(maqnit əqrəbi haq.)*;
◊ **to ~ into** *one's* **means/***one's* **purse, to ~** *one's* **hand into** *one's* **purse** pulunu sağa-sola xərcləmək / havayı xərcləmək

**diphtheria** [dıf'θıərıə] *n tib.* difterit *(yoluxucu boğaz xəstəliyi)*, boğma

**diphtheritis** [.dıfθə'raıtıs] *n tib.* = **diphtheria**

**diphthong** ['dıfθɔŋ] *n fon.* diftonq *(iki saitin birləşməsindən əmələ gələn səs)*

**diphthongal** [dıf'θɔŋəl] *adj fon.* diftonq; **~ sounds** diftonq səslər

**diphthongize** ['dıfθɔŋgaız] *v fon.* diftonqlaşdırmaq; diftonq kimi tələffüz etmək

**diploma[1]** [dı'ploumə] *n* diplom; **to take/to have a ~** diplom almaq; **~ in education** pedaqoq / müəllim diplomu

**diploma[2]** [dı'ploumə] *v* diplom vermək

**diplomacy** [dı'plouməsı] *n* **1.** diplomatiya *(hökumətin beynəlxalq siyasəti sahəsindəki fəaliyyəti)*; **open/secret ~** açıq/örtülü diplomatiya; *International problems must be solved by diplomacy, not war Beynəlxalq problemlər müharibə yolu ilə deyil, diplomatiya vasitəsilə həll edilməlidir;* **2.** siyasətçilik, hiyləgərlik, ustalıq; mahirlik

**diplomat** ['dıpləmæt] *n* diplomat *(1) xarici hökumətlərlə danışıq aparmaq və əlaqə saxlamaq üçün təyin olunmuş dövlət nümayəndəsi; 2) məc. siyasətçi)*

**diplomatic** [.dıplə'mætık] *adj* **1.** diplomatik; **~ agent** diplomatik nümayəndə; **~ means** diplomatik vasitələr; **to settle disputes by ~ means** münaqişəni diplomatik vasitələrlə həll etmək; **~ relations** diplomatik əlaqələr; **to break off/to establish ~ relations with a country** bir ölkə ilə diplomatik əlaqələri kəsmək / əlaqələr yaratmaq; **~ corps/body** diplomatik korpus; **~ mail** diplomatik poçt; **~ service** diplomatik xidmət; **~ immunity** diplomatik toxunulmazlıq; **2.** ədəbli, nəzakətli; mülayim; **~ conduct** nəzakətli /ədəbli davranış; **3.** fəndgir, diribaş, zirək

**diplomatically** [.dıplə'mætıkəlı] *adv* **1.** diplomatcasına, ustalıqla, məharətlə; **2.** diplomatik vasitə ilə /yolla

**diplomatics** [.dıplə'mætıks] *n* **1.** diplomatiya *(hökumətin beynəlxalq siyasət sahəsindəki fəaliyyəti;* **2.** diplomatika *(tarixi sənədlərin həqiqiliyini öyrənən köməkçi tarix elmi)*

**diplomatist** [dı'ploumətıst] *n* **1.** = **diplomat**; **2.** diplomat adam, nəzakətli/ ədəbli adam

**dipper** ['dıpər] *n* çay kənarında yaşayan quş

**dipsomania** [.dıpsə'meınjə] *n tib.* alkoqolizm, içki düşkünlüyü, əyyaşlıq

**dipsomaniac** [.dıpsə'meınıæk] *n* alkoqolik, əyyaş, içki düşkünü

**dipstick** ['dıp.stık] *n tex.* ölçü mili; səviyyə göstəricisi *(motorun içərisində yağın, çənlərdə mayenin səviyyəsini ölçmək üçün alət)*

**dire** ['daıər] *adj* **1.** dəhşətli, qorxulu, qorxunc, müdhiş; çox şiddətli; **~ revenge** dəhşətli qisas; **a ~ situation** qorxulu vəziyyət; **~ warnings** çox ciddi xəbərdarlıqlar; **~ poverty** dəhşətli yoxsulluq; *Such action may have dire consequences Belə hərəkətin müdhiş/dəhşətli nəticələri ola bilər;* **2.** qəddar, qatı; **~ foe** qəddar/qatı düşmən

**direct[1]** [dı'rekt, daı'rekt] *adj* **1.** düz; **a ~ road** düz yol; **~ line** düz xətt; **in the ~ line** düz xətt üzrə; **2.** birbaşa; bilavasitə; açıq-aydın, şübhəsiz; **a ~ lie** açıq-aydın/ağ yalan; **a ~ train** birbaşa qatar; *There's a direct train from London to Manchester Londondan Mançestrə birbaşa qatar var;* **3.** açıq, düz üzünə; aydın; **a ~ answer** açıq cavab; **a ~ statement** aydın bəyanat; **4.** vasitəsiz, bilavasitə; **~ influence** bilavasitə təsir; **~ contact** bilavasitə əlaqə/ kontakt; **~ communication** bilavasitə əlaqə; **~ tax** vasitəsiz vergi; **~ method** vasitəsiz metod; **5.** tam; mütləq; absolyut; **~ opposite/contrary** mütləq əkslik; **6.** vertikal, şaquli, dik; **~ sun** günəşin vertikal / şaquli düşən şüası; **7.** *dilç.* vasitəsiz; **~ speech** vasitəsiz nitq; **~ object** vasitəsiz tamamlıq; **8.** *el.* sabit; **~ current** sabit cərəyan

**direct[2]** [dı'rekt, daı'rekt] *v* **1.** yönəltmək, tuşlamaq; istiqamətləndirmək, istiqamət vermək; yol göstərmək; **to ~** *one's* **steps to the house** evə yollanmaq; **to ~ attention to an interesting fact** diqqəti maraqlı fakta yönəltmək; **to ~** *one's* **efforts / energies to** *smth.* səylərini / gücünü bir şeyə yönəltmək, səylərini/gücünü bir şeyə sərf etmək; *I'm lost. Can you direct me to the station? Mən yolumu itirmişəm /azmışam. Məni vağzala istiqamətləndirə bilərsənmi/bilərsinizmi?;* **2.** rəhbərlik/ idarə /nəzarət etmək; **to ~ a business** müəssisəyə rəhbərlik etmək; **3.** göstəriş vermək, təklif etmək; **to ~** *smb.* **to come** gəlmək üçün bir kəsə göstəriş vermək; **4.** məsləhət /öyüd/öyüd-nəsihət vermək; **to ~** *smb.* **in matters of diplomacy** bir kəsə diplomatiya məsələləri üzrə məsləhət vermək; **5.** ünvanlamaq; göndərmək, adresə/ünvana göndərmək; **to ~ a letter/a parcel to** *smb.* bir kəsə məktub/bağlama göndərmək; **6.** dirijorluq etmək; **to ~ an orchestra** orkestrə dirijorluq etmək; **7.** rejissorluq etmək; kinofilm çəkmək

**direct[3]** [dı'rekt, daı'rekt] *adv* düz, düzünə; birbaşa, bilavasitə; **to go / to come ~ to London** düz / birbaşa Londona getmək / gəlmək

**direction** [dı'rekʃn, daı'rekʃn] *n* **1.** istiqamət; tərəf, səmt; **in the ~ of London** London istiqamətində/tərəfə; **from all ~s** hər tərəfdən; *Shots were fired about in all directions Hər tərəfdən*

*atəş açıldı; Tom went off in one direction and Harry in another Tom çıxıb bir tərəfə getdi, Hari başqa tərəfə;* 2. *məc.* sahə, xətt; **reforms in many ~s** çox sahələrdə islahatlar; 3. rəhbərlik; **the ~ of a bank** bankın rəhbərliyi; **to work under** *smb.'s* ~ bir kəsin rəhbərliyi altında işləmək; 4. göstəriş, təlimat, qayda; **~s for use** istifadə/işlənmə qaydaları; **to give ~s to** *smb.* bir kəsə təlimat/göstəriş vermək; 5. rejissorluq, aktyorlarla iş aparma

**directional** [dɪ'rekʃənl, daɪ'rekʃənl] *adj* istiqamətləndirilmiş; **~ antenna** istiqamətləndirilmiş antenna

**directive** [də'rektɪv, dɪ-, daɪ-] *n* direktiv, göstəriş, tapşırıq

**directly**[1] [dɪ'rektlɪ, daɪ'rektlɪ] *adv* 1. düz; *He looked directly at us O düz bizə baxdı;* **to go ~ towards a house** düz evə doğru getmək; 2. açıq, açıq-açığına; **to condemn** *smb.* ~ bir kəsi açıq-açığına ittiham etmək; 3. birbaşa; **to come ~ to the point** birbaşa məsələnin məğzinə/mahiyyətinə toxunmaq; 4. bilavasitə, vasitəsiz olaraq; **~ responsible** bilavasitə məsuliyyət daşıyan; *He is directly affected Bu onun işidir;* 5. dərhal, o saat, təxirsiz; tezliklə; **~ after this** dərhal bundan sonra; *I will come directly Mən tezliklə gələcəm;* 6. tamamilə; düz; **~ contrary / opposed** tamamilə zidd; **to stand ~ in the road** düz yolda durmaq

**directly**[2] [dɪ'rektlɪ, daɪ-] *conj.* kimi; *I went home directly I had finished work Mən işi qurtaran kimi evə getdim*

**directness** [dɪ'rektnɪs, daɪ-] *n* doğruluq, düzlük, açıqlıq, səmimilik; **~ of speech** danışığın açıqlığı / səmimiliyi

**director** [dɪ'rektəʳ, daɪ-] *n* 1. idarə heyətinin üzvü; direktor; **board of ~s** idarə heyəti; 2. rəhbər, rəis; **~ of studies** tədqiqatın rəhbəri; 3. rejissor; quruluşçu-rejissor; **assistant ~** rejissor köməkçisi; 4. dirijor

**directorate** [dɪ'rektərɪt] *n* 1. müdiriyyət; 2. direktorluq

**directorship** [dɪ'rektəʃɪp] *n* direktorluq

**directory** [dɪ'rektərɪ] *n* dərslik, soraq/arayış kitabçası; **telephone ~** telefon kitabı

**dirge** [də:dʒ] *n* 1. cənazə duası; dəfn etmə xidməti; 2. ağı; dəfn /matəm mahnısı; qəmli mahnı və ya musiqi

**dirhem** [dɪr'hem] *n* dirhəm *(ərəb ölkələrində çəki vahidi, Mərakeşdə pul vahidi)*

**dirijible** ['dɪrɪdʒəbl] *n av.* dirijabl *(hava gəmisi)*

**dirk** [də:k] *n* 1. şotland xəncəri; 2. kortik *(dəniz və hava donanması komandirlərinin gəzdirdiyi gödək qılınc)*

**dirk-knife** ['də:knaɪf] *n (pl* **-knives** [-naɪvz]) qatlanan böyük bıçaq

**dirl** [də:l] *v* 1. deşmək, dələmək, sancmaq; vurub deşmək, dəlib keçmək; deşik-deşik etmək; 2. titrəmək, əsmək; 3. cingildəmək, dınqıldamaq

**dirt**[1] [də:t] *n* 1. çirk, kir, zibil; *Wash the dirt off your hand Əlinin / Əlinizin çirkini yu / yuyun;* **to be covered with ~** çirklə / kirlə örtülü olmaq; *The floor is covered with dirt Döşəmə çirklənib;* 2. torpaq; *The children were outside playing happily in the dirt Uşaqlar çöldə səs-küylə torpağın içində oynayırdılar;* 3. natəmizlik, çirklilik; 4. nalayiqlik, ədəbsizlik, nalayiq/ədəbsiz söz; qeybət; pislik, alçaqlıq; *She enjoys hearing a bit of dirt about her neighbours O, qonşuları haqda nalayiq söz/qeybət eşitməkdən həzz alır;* **to do** *smb.* ~ bir kəsə pislik/etmək, bir kəsə qarşı nalayiq/alçaq hərəkət etmək; 5. əxlaqsızlıq, ədəbsizlik; pozğunluq, əxlaq pozğunluğu, həyasızlıq;

◊ **to throw/to cast ~ at** *smb.* bir kəsi rüsvay etmək / ləkələmək / alçaltmaq; **to treat** *smb.* **like ~** bir kəslə əsla hesablaşmamaq, bir kəsi zibilə də hesab etməmək

**dirt**[2] [də:t] *adj:* **~ farmer** öz işlərini özü görən fermer

**dirt-cheap** ['də:t'ʃi:p] *adv* ucuz qiymətə, havayı; *I got it dirt cheap Mən onu çox ucuz / havayı aldım*

**dirt-floor** ['də:t'flɔ:ʳ] *n* torpaq döşəmə

**dirt-road** ['də:t'roud] *n* torpaq yol

**dirtily** ['də:tɪlɪ] *adv* 1. çirkli/kirli bir surətdə; 2. alçaqcasına, əclafcasına, namərdcəsinə, abırsızlıqla, şərəfsizcəsinə

**dirtiness** ['də:tɪnɪs] *n* 1. çirk, palçıq, zığ; pislik; 2. alçaqlıq, əclaflıq, rəzalət, rəzillik

**dirt-track** ['də:t.træk] *n* motosikl yarışı üçün trek

**dirty**[1] ['də:tɪ] *adj* (**-ier, -iest**) 1. çirkli, çirk, kirli; murdar, natəmiz; **~ hands** çirkli/kirli əllər; **~ streets** çirkli / natəmiz küçələr; **to get ~** çirklənmək; *My dress is getting dirty Mənim paltarım çirklənir;* 2. alçaq, əclaf, rəzil, iyrənc; **~ war** iyrənc müharibə; **~ trick** iyrənc kələk; 3. nalayiq, ədəbsiz, həyasız, yaramaz; **~ novel** ədəbsiz / nalayiq roman; **to tell ~ stories** ədəbsiz lətifələr danışmaq; *They sat up drinking and telling dirty stories Onlar oturub içir və nalayiq lətifələr danışırdılar;* 4. pis, yağışlı, buludlu, tutqun *(hava haq.),* tufanlı, boranlı, küləkli; **~ night** tufanlı / boranlı gecə; *I'm glad I don't have to go out on such a dirty night Mən şadam ki, belə tufanlı / boranlı gecədə bayıra çıxmalı deyiləm;* **~ weather** yağışlı tutqun hava; **~ sea** tufanlı dəniz;

◊ **to do the ~ on** *smb.* bir kəslə nalayiq zarafat etmək, bir kəsə qarşı alçaqlıq etmək; bir kəsi ələ salmaq

**dirty**[2] ['də:tɪ] *v (pt, pp* **dirtied**) çirkləndirmək, kirləndirmək; **to ~** *one's* **hands** əllərini çirkləndirmək/kirləndirmək; *Don't dirty your hands Əllərini / Əllərinizi çirkləndirmə / çirkləndirməyin*

**dis-** [dɪs-] *pref.* 1. *felin əsasına əlavə edilir və ona*



*inkar məna verir;* to **disaffirm** inkar etmək; **to join** birləşdirmək - **to disjoin** ayırmaq; 2. *Sifətə əlavə edilir və ona inkar məna verir:* **honest** vicdanlı, namuslu - **dishonest** vicdansız, namussuz; 3. *İsmin əvvəlinə artırılır və ona inkar məna verir:* **agreement** razılıq - **disagreement** narazılıq; **affection** razılıq **disaffection** - narazılıq; 4. *Sifətlərin əvvəlinə artırılır və keyfiyyətin yoxluğunu ifadə edir:* **disagreeable** xoşagəlməz, çirkin; **disobedient** itaət etməyən, sözə baxmayan

**disability**[1] [.dɪsə'bɪlɪtɪ] *n* 1. qabiliyyəti / bacarığı olmama, qabiliyyətsizlik, bacarıqsızlıq; şikəstlik; **~ to do** *smth.* bir şeyi edə bilməyə qabiliyyəti / bacarığı olmama; 2. maneə, əngəl, çətinlik; 3. borcunu ödəyə / verə bilməmə

**disability**[2] [.dɪsə'bɪlɪtɪ] *adj* əmək qabiliyyəti/iqtidarı olmayan, əmək qabiliyyətini itirmiş, əlil, əlillik; **~ benefits** əlilliyə/ şikəstliyə görə müavinət; **~ insurance** iş/əmək qabiliyyətini itirdiyinə görə sığorta etdirmə; **~ pension** əlillik təqaüdü; *He gets a disability pension from the Government O, dövlətdən əlilliyə görə təqaüd alır*

**disable** [dɪs'eɪbl] *v* 1. əmək qabiliyyətindən məhrum etmək, sıradan çıxartmaq, yararsız vəziyyətə salmaq; şikəst etmək; **to ~** *smb.* **from doing** *smth.***/to do** *smth.* bir kəsi bir işi görmək qabiliyyətindən məhrum etmək; 2. şikəst olmaq *(adət. məchul növdə işlədilir); He was disabled in the war O, müharibədə şikəst olub*

**disabled** [dɪs'eɪbld] *adj* şikəst; əlil; çolaq; şikəst edilmiş; **a ~ soldier** şikəst/əlil əsgər; **a ~ worker** şikəst/əlil edilmiş fəhlə; **the ~** *top.i* əlillər, şikəstlər; *The disabled are to receive pension Əlillər təqaüd almalıdırlar*

**disablement** [dɪs'eɪblmənt] *n* 1. əmək qabiliyyətini itirmə, sıradan çıxma, yararsız vəziyyətə salma / düşmə; 2. şikəstlik, əlillik, çolaqlıq

**disabuse** [.dɪsə'bju:z] *v* fikrindən daşındırmaq/döndərmək; *I must disabuse you of that idea Mən səni/sizi o fikirdən daşındırmalıyam*

**disaccord**[1] [.dɪsə'kɔ:d] *n* razı olmama, razılaşmama, ixtilaf; fikir ayrılığı, anlaşılmazlıq

**disaccord**[2] [.dɪsə'kɔ:d] *v* razılaşmamaq, şərik olmamaq *(fikircə və s.);* uyğun olmamaq / gəlməmək

**disacknowledge** [.dɪsək'nɔlɪdʒ] *v* etiraf etməmək, etiraf etməkdən boyun qaçırmaq, boynuna almamaq

**disadvantage**[1] [.dɪsəd'va:ntɪdʒ] *n* 1. əlverişsiz vəziyyət; **to be at a ~** əlverişsiz vəziyyətdə olmaq; **to put** *smb.* **at a ~** bir kəsi çətin vəziyyətə salmaq; *His inability to speak French puts him at a disadvantage Fransız dilində danışa bilməməsi onu çətin vəziyyətə salır;* **to study under ~s** əlverişsiz şəraitdə oxumaq; *The other candidate's main disadvantage is his age O biri namizəd üçün əlverişsiz vəziyyət onun yaşıdır;* 2. defekt, çatışmazlıq, ziyan, zərər; **to sell to ~** ziyana satmaq; *The new Common Market regulations could be/work to the disadvantage of British farmers Yeni Ümumi Bazarın qaydaları Britaniya fermerlərinin ziyanına ola bilər*

**disadvantage**[2] [.dɪsəd'va:ntɪdʒ] *v* 1. pis/ çıxılmaz vəziyyətə salmaq, çıxılmaz vəziyyətdə qoymaq; 2. zərər / ziyan vermək, zərərə / ziyana salmaq

**disadvantaged** [.dɪsəd'va:ntɪdʒd] *adj* yoxsul, kasıb, əlsiz-ayaqsız, imkansız; **the ~** *top.i* yoxsullar, kasıblar, imkansızlar; **appeals on behalf of the ~** yoxsullar adından müraciət

**disadvantageous** [.dɪsædva:n'teɪdʒəs] *adj* faydasız, əlverişsiz, sərfəsiz, zərərli, yaramayan; pis; **in a ~ position** əlverişsiz / pis vəziyyətdə

**disadvantageously** [.dɪsædva:n'teɪdʒəslɪ] *adv* sərfəsiz, faydasız, əlverişsiz; sərfəsiz / faydasız / əlverişsiz vəziyyətdə

**disadvise** [.dɪsəd'vaɪz] *v* məsləhət görməmək / bilməmək, daşındırmaq

**disaffected** [.dɪsə'fektɪd] *adj* narazı *(xüs. hökumətdən);* qeyri-loyal, loyal olmayan; sərt, qeyri-səmimi, pis niyyətli, dost olmayan; əleyhinə olan; **some ~ members** bəzi narazı üzvlər; *Some disaffected members left to form a new party Bəzi narazı üzvlər yeni partiya yaratmaq üçün ayrıldılar*

**disaffection** [.dɪsə'fekʃn] *n* narazılıq *(xüs. hökumətdən);* bədxahlıq, qərəzkarlıq, səmimiyyətsizlik, ədavət; *There are signs of growing disaffection among his followers Onun davamçıları arasında artan narazılıq əlamətləri var*

**disaffirm** [.dɪsə'fə:m] *v* 1. inkar etmək, danmaq; 2. *hüq.* ləğv etmək *(qərarı)*

**disaffirmance** [.dɪsə'fə:məns] *n hüq.* ləğv etmə

**disafforest** [.dɪsə'fɔrɪst] *v* meşəni qırmaq

**disagree** [.dɪsə'grɪ:] *v* 1. *(pt, pp* **-reed**) 1. razılaşmamaq, müxtəlif fikirdə olmaq; **to ~ with** *smb.* **over a matter** bir məsələdə bir kəslə razılaşmamaq; 2. mübahisə etmək, höcətləşmək, sözə gəlmək; *We always disagree Biz həmişə mübahisə edirik; Even friends sometimes disagree Hətta dostlar da bəzən mübahisə edirlər;* 3. **(to, with)** razılıq verməmək; **to ~ to the amendment** düzəlişə razılıq verməmək; 4. ziyan etmək / vermək, pis təsir göstərmək; **to ~ with** ziyan etmək, pis təsir etmək *(yemək və ya iqlim haq.); Chocolate always disagrees with me Şokolad mənə həmişə pis təsir edir; The climate disagrees him / with his health Bu iqlim / abhava ona / onun sağlamlığına pis təsir edir;* 5. zidd olmaq, uyğun gəlməmək; uyuşmamaq; *These 2 reports of the accident disagree Hadisə haqqında olan bu iki məlumat uyğun gəlmir*

**disagreeable** [.dɪsə'grɪ:əbl] *adj* 1. pis, xoşagəlməz, xoşagetməz, iyrənc, mənfur; **~ smell** pis/xoşagəlməz/iyrənc iy; **~ weather** pis/iyrənc /mənfur hava; **a ~ person** pis /xoşagəlməz/xo-

şagetməz/mənfur adam; **a ~ job** xoşagəlməz/iyrənc iş; *Sweeping chimneys is a disagreeable job Baca təmizləmək xoşagəlməz işdir;* 2. deyingən, ağırxasiyyətli

**disagreeably** [.dɪsə'ri:əblɪ] *adv* pis; xoşagəlməz bir halda / tərzdə

**disagreement** [.dɪsə'grɪ:mənt] *n* 1. fərq, təfavüt, ayrılıq; uyğunsuzluq, ziddiyyət; **~ between the two reports** iki məlumat arasında uyğunsuzluq /ziddiyyət; *There is some disagreement between these two statements Bu 2 məlumat/bəyanat arasında uyğunsuzluq var;* 2. fikir ayrılığı, narazılıq, ixtilaf, nifaq; *There has been serious disagreement between the 2 political parties over this question Bu məsələ üzrə bu iki siyasi partiya arasında ciddi fikir ayrılığı var;* 3. pislik; toqquşma, çəkişmə, ixtilaf, mübahisə; anlaşılmazlıq

**disallow** [.dɪsə'lau] *v* 1. rədd/imtina etmək, rədd cavabı vermək; **to ~ a claim** *hüq.* iddianı/tələbi rədd etmək; 2. saymamaq, hesaba almamaq; **to ~ a goal** qolu saymamaq *(futbol oyununda);* 3. qadağan/yasaq etmək

**disallowance** [.dɪsə'lauəns] *n* 1. rədd etmə / edilmə; boyun qaçırma, imtina etmə; 2. qadağan, yasaq; qadağan / yasaq etmə

**disannul** [.dɪsə'nʌl] *v* ləğv etmək, tamamilə məhv etmək

**disappear** [.dɪsə'pɪə<sup>r</sup>] *v* 1. görünməmək, gözdən itmək, görünməz olmaq; *The ship disappeared Gəmi gözdən itdi/görünməz oldu; The plane disappeared behind the clouds Təyyarə buludların arxasında gözdən itdi;* 2. itmək, yox/qeyb olmaq, tapılmamaq; *My passport has disappeared - it was in my pocket a moment ago Mənim pasportum itib - bir az bundan qabaq cibimdə idi; My keys have disappeared off the table Mənim açarlarım stolun üstündən yoxa çıxıb;*

◊ **to do a ~ing act** qeybə/yoxa çıxmaq, aradan çıxmaq; *It's typical of Bob to do a disappearing act just when there's work to be done İş görmək lazım olduqda aradan çıxmaq Bobun adətidir*

**disappearance** [.dɪsə'pɪərəns] *n* gözdən itmə, yox /qeyb olma; qeybə/yoxa çıxma; itmə; *At first nobody noticed the child's disappearance Əvvəlcə uşağın itməsini heç kim/kəs hiss etmədi; Many disappearances are the result of terrorist activity Çox yox olmaların / itmələrin səbəbi terrorist fəaliyyətin nəticəsidir*

**disappoint** [.dɪsə'pɔɪnt] *v* 1. məyus / naümid etmək, ümidi boşa çıxmaq/doğrulmamaq; **to ~ *smb.*** bir kəsi məyus etmək; *I'm sorry to disappoint you, but I can't come to you to day Mən səni/sizi məyus etdiyimə görə məni bağışla/bağışlayın, bu gün sizə gələ bilməyəcəyəm; I was disappointed not to see him there Onu orada görə bilmədiyim üçün məyus oldum;* 2. boşa çıxartmaq, pozmaq, alt-üst etmək *(planı, ümidi və s.);* **to ~ *smb.*'s hope** bir kəsin ümidini boşa çıxartmaq; **to ~ *smb.*'s plan** bir kəsin planını pozmaq / alt-üst etmək; *I'm sorry to disappoint your plan Sənin / Sizin planını / planınızı puç etdiyim / alt-üst etdiyim üçün üzr istəyirəm*

**disappointed** [.dɪsə'pɔɪntɪd] *adj* məyus, ümidsiz, ümidi boşa çıxmış; ovqatı təlx, dərdli, qüssəli, dilxor, pərişan; **~ look** məyus/qüssəli/pərişan baxış; **to be deeply ~ by / at *smb.*'s failure** bir kəsin məğlubiyyətindən bərk məyus olmaq; *I was disappointed not to be chosen Seçilmədiyimə görə mən pərişan / dilxor oldum*

**disappointedly** [.dɪsə'pɔɪntɪdlɪ] *adv* məyus / pərişan / dilxor halda / tərzdə; **to speak ~** məyus /pərişan/dilxor tərzdə danışmaq

**disappointing** [.dɪsə'pɔɪntɪŋ] *adj* 1. pis, təmin etməyən, kifayətlənməyən; 2. məyus/dilxor/pərişan edən; *What disappointing news! Nə dilxor/pərişan edici xəbər!; Your examination marks are rather disappointing Sənin/Sizin imtahan qiymətlərin / qiymətləriniz çox məyus edicidir*

**disappointingly** [.dɪsə'pɔɪntɪŋlɪ] *adv* pis / təmin etməyən dərəcədə; təəssüf ediləcək dərəcədə; *The audience was disappointingly small Tamaşaçı təəssüf ediləcək dərəcədə az idi*

**disappointment** [.dɪsə'pɔɪntmənt] *n* ümidsizlik, ümidi kəsilmə/boşa çıxma, məyusluq, məyus olma; **vivid ~** aydın görünən məyusluq/ümidsizlik; **to feel ~** məyusluq /ümidsizlik hiss etmək; **to give *smb.* ~** bir kəsin ümidini doğrultmamaq/boşa çıxarmaq; **to suffer ~s** ümidsizliyə/məyusluğa düçar olmaq; *The party was a great disappointment Qonaqlıqda hamı məyus oldu; The meeting was a disappointment İclas ümidləri doğrultmadı; He is a disappointment to his parents O, valideynlərinin ümidini doğrultmur*

**disapprobation** [.dɪsæprou'beɪʃn] *n* bəyənməmə, pisləmə, mənfi münasibət/qiymət

**disapprobative** [dɪs'æproubeɪtɪv] *adj* pis, bəyənilməz, xoşagəlməyən, mənfi; ittihamedici, ittiham edən

**disapproval** [.dɪsə'pru:vəl] *n* bəyənməmə, pisləmə, mənfi münasibət/qiymət; **to shake *one's* head in ~** başını narazı halda silkələmək; *He shook his head in disapproval O, başını narazı halda silkələdi*

**disapprove** ['dɪsə'pru:v] *v* 1. bəyənməmək, pisləmək, töhmətləndirmək, qınamaq, məzəmmətləndirmək; **to ~ *smb.*** bir kəsi qınamaq/töhmətləndirmək; **to ~ of an action** bir hərəkəti pisləmək; *She wants to be an actress, but her parents disapprove of the idea O, aktrisa olmaq istəyir, lakin onun valideynləri bu fikri bəyənmir;* 2. rədd etmək, bəyənməmək, qəbul etməmək *(qanun layihəsini və s.)*

**disappovingly** ['dɪsə'pru:vɪŋlɪ] *adv* pis, mənfi *(olaraq)*, narazı halda; **to look at *smb.* ~** bir kəsə narazı halda baxmaq

**disarm** [dɪs'a:m] *v* 1. silahsızlaşdırmaq, silahını



almaq; tərk-silah etmək; **to ~ *one's* opponent** düşməni silahsızlaşdırmaq/tərk-silah etmək; *həm də məc.* düşmənin silahını əlindən almaq /vurub salmaq; 2. sakitləşdirmək, soyutmaq, iqtidarını əlindən almaq; **to ~ *smb.*'s anger** bir kəsin acığını/hirsini soyutmaq; *I felt annoyed with her, but her smile disarmed me Mənim ona bərk acığım tutmuşdu, lakin onun təbəssümü məni sakitləşdirdi;* 3. silahı yerə qoymaq, silahsızlaşmaq, tərk-silah olunmaq; *The superpowers are unlikely to disarm unilaterally Çox çətin ki, super dövlətlər birtərəfli tərk-silah olunsunlar*

**disarmament**[1] [dɪs'a:məmənt] *n* silahsızlaşdırma, silahı yerə qoyma, tərk-silah; **general and complete ~** tam və hamılıqla tərk-silah; **partial/total ~** qismən/tam tərk-silah

**disarmament**[2] [dɪs'a:məmənt] *adj* tərk-silah, silahsızlaşma; **~ problem** tərk-silah problemi; **a ~ conference** tərk-silah məsələləri üzrə konfrans

**disarming** [dɪs'a:mɪŋ] *adj* sakitləşdirici, barışdırıcı, susdurucu; **~ smile** sakitləşdirici / barışdırıcı təbəssüm; **~ frankness** sakitləşdirici / barışdırıcı səmimiyyət

**disarrange** ['dɪsə'reɪndʒ] *v* dağıtmaq, pozmaq, qatışdırmaq; **to ~ *one's* hair** saçını qatışdırmaq/pırtlaşdırmaq; **to ~ *smb.*'s papers** bir kəsin kağızlarını qarışdırmaq; **to ~ *smb.*'s plan** bir kəsin planını pozmaq/dolaşdırmaq

**disarrangement** [.dɪsə'reɪndʒmənt] *n* dağıtma, dağılma; qarışıqlıq, nizamsızlıq, qaydasızlıq

**disarray**[1] ['dɪsə'reɪ] *n* 1. qarışıqlıq, qaydasızlıq, nizamsızlıq, çaxnaşma, vəlvələ, həyəcan; çaşqınlıq; *After their disastrous election result, the opposition parties are in some disarray Onların seçkilərinin faciəli nəticəsindən sonra müxalifət partiyaları çaşqınlıq içərisindədir;* 2. səliqəsizlik *(paltar haq.);* **in ~** səliqəsiz halda; *She rushed out of the burning house with her clothes in disarray O necə gəldi geyinmiş halda yanan evdən bayıra atıldı*

**disarray**[2] ['dɪsə'reɪ] *v* 1. dolaşdırmaq, qarışdırmaq, dolaşıqlıq/ qarışıqlıq / vəlvələ salmaq; 2. *şair.* soyundurmaq, paltarını çıxartmaq

**disassemble** [.dɪsə'sembl] *v tex.* sökmək; **to ~ an engine** motoru sökmək; **to ~ a car** maşını sökmək

**disassociate** [.dɪsə'souʃɪeɪt] *v* **(with, from)** *tex.* kəsmək, ayırmaq

**disaster** [dɪ'za:stə<sup>r</sup>] *n* fəlakət, müsibət, bəla, bədbəxtlik; **to bring ~ upon *smb.*** bir kəsə bədbəxtlik / bəla gətirmək; **to meet with ~** fəlakətə/bəlaya düçar olmaq; **political ~** siyasi bəla; *The election results will bring political disaster Seçkinin nəticələri siyasi bəla gətirəcək;* **an air / sea / train ~** havada / dənizdə / dəmir yolunda fəlakət; *The loss of the ship was a disaster Gəminin itməsi fəlakət/bədbəxtlik idi*

**disastrous** [dɪ'za:strəs] *adj* fəlakətli, bəlalı; müsibətli; fəlakət / bədbəxtlik gətirən; **a ~ flood** məhvedici daşqın; **a ~ marriage** fəlakət /bədbəxtlik gətirən izdivac; **a ~ decision** fəlakətli/bədbəxtlik gətirən qərar; **~ consequences** fəlakətli nəticələr; **a ~ mistake** fəlakətli səhv; *The results were disastrous Nəticələr fəlakətli idi*

**disavow** [.dɪsə'vau] *v* 1. danmaq, imtina etmək, inkar etmək, etiraf etməmək, məsuliyyətdən boyun qaçırmaq, üz döndərmək; **to ~ *one's* signature** öz imzasından imtina etmək; **to ~ *one's* daughter/son** qızından/oğlundan imtina etmək; 2. razılaşmamaq, razı olmadığını bildirmək

**disavowal** [.dɪsə'vauəl] *n* 1. danma, inkar etmə; inkar; dönmə, üz döndərmə; əl çəkmə; etiraf etməmə; 2. razılaşmama, razı olmadığını bəyan etmə / bildirmə

**disband** [dɪs'bænd] *v* 1. buraxmaq; 2. *hərb.* ləğv etmək, buraxmaq, dağıtmaq; **to ~ an army** ordunu buraxmaq; *The troops disbanded Qoşunlar pərən-pərən oldu; The regiment (was) disbanded soon after the war Polk/Alay müharibədən sonra dərhal buraxıldı*

**disbandment** [dɪs'bændmənt] *n hərb.* ləğv etmə /edilmə; buraxma, buraxılma, dağıtma, dağıdılma

**disbar** [dɪs'ba:] *v hüq.* vəkilin hüququnu *(əlindən)* almaq, vəkili məhkəmədə çıxış etmək hüququndan məhrum etmək

**disbark** [dɪs'ba:k] *v* qabığını soymaq/almaq

**disbelief** ['dɪsbɪ'li:f] *n* inanmama, etimad etməmə, inamsızlıq, etimadsızlıq, inanmamazlıq; ateizm, dinsizlik, allaha inanmama

**disbelieve** ['dɪsbɪ'li:v] *v* inanmamaq; etimad etməmək; **to ~ *smb.*** bir kəsə inanmamaq; *I disbelieve you Mən sənə/sizə inanmıram; He says it's true, and I have no reason to disbelieve him O deyir ki, bu düzdür və mənim ona inanmamağa əsasım yoxdur*

**disbeliever** ['dɪsbɪ'li:və<sup>r</sup>] *n* dinə/allaha inanmayan; dinsiz, ateist

**disburden** [dɪs'bə:dn] *v* 1. ağırlığı götürmək, yükü boşaltmaq, yükdən azad etmək; 2. yükdən / ağırlıqdan azad olmaq; boşalmaq, yükü boşalmaq; **to watch a ship ~** gəminin boşaldılmasını müşahidə etmək; 3. boşaltmaq, yüngülləşdirmək; **to ~ *one's* heart** ürəyini boşaltmaq; 4. qoymaq, atmaq; **to ~ *one's* cares upon another** öz dərdini / qayğısını başqasının üstünə / boynuna qoymaq

**disburse** [dɪs'bə:s] *v* 1. ödəmək, vermək, haqqını vermək; əvəzini vermək; 2. xərcləmək, xərc / sərf etmək

**disbursement** [dɪs'bə:smənt] *n* 1. ödəmə, vermə, ödənmə, verilmə; hissə-hissə ödəmə /ödənmə; **the ~ of loans** istiqrazların hissə-hissə ödənilməsi; 2. xərc, çıxar, məxaric, məsarif

**disc** [dɪsk] *n* = **disk** *(1-ci və 2-ci mənada)*
**discal** [dɪskl] *adj* diskşəkilli, diskəbənzər, diskəoxşar, dairəşəkilli, dairəyəoxşar, dairəvari
**discard¹** ['dɪska:d] *n* 1. atma, kənara qoyma *(qumar kağızını)*, kənara atılan / qoyulan şey; 2. lazım olmayan şey
**discard²** [dɪs'ka:d] *v* 1. imtina etmək, vaz keçmək, rədd etmək; **to ~ outdated beliefs** köhnəlmiş inamlardan imtina etmək; **to ~ a hypothesis** fərziyyəni qəbul etməmək/rədd etmək; **to ~ old friends** köhnə/ əski dostlardan imtina etmək; 2. çıxartmaq, soyunmaq; **to ~ *one's* winter clothes in spring** qış paltarlarını yazda çıxartmaq/soyunmaq; 3. kənara qoymaq *(lazım olmayan qumar kağızlarını); She discarded a four and picked up a king O, dördlük qumar kağızını atdı və kralı götürdü;* 4. *tex.* zay çıxartmaq, brak etmək
**discern** [dɪ'sə:n] *v (Davamedici zaman formasında işlənmir)* 1. görmək, seçmək; **to ~ a spire in the distance** uzaqda dağın zirvəsini görmək; *In the gloom I could just discern the outline of a building Qaranlıqda mən ancaq binanın qaraltısını görə / seçə bildim;* 2. hiss etmək; **to ~ an odour** iy/qoxu hiss etmək; 3. anlamaq, başa düşmək, görmək; **to ~ no difference** heç bir fərq görməmək; **to ~ real causes** əsl səbəbləri görmək / başa düşmək; 4. fərqləndirmək, fərqini görmək, seçmək; **to ~ right and wrong, to ~ right from wrong** doğrunu/səhvdən fərqləndirmək / ayırmaq / seçmək
**discernible** [dɪ'sə:nəbl] *adj* görünən, görünə bilən, gözəçarpan, gözə çarpa bilən; **~ outline** gözə çarpa bilən qaraltı; **~ signs of economic recovery** iqtisadi dirçəlişin gözə çarpan əlamətləri
**discernibly** [dɪ'sə:nəblɪ] *adv* gözə / nəzərə çarpacaq dərəcədə, hiss olunacaq dərəcədə
**discerning** [dɪ'sə:nɪŋ] *adj* 1. fərq qoya bilən, fərqləndirməyi bacaran; 2. ağıllı, fərasətli, bəsarətli, gözüaçıq, açıqgözlü; **~ critic** ağıllı/fərasətli tənqidçi; **a ~ man** ağıllı / bəsarətli / gözüaçıq adam
**discernment** [dɪ'sə:nmənt] *n* 1. dərketmə, dərketmə qabiliyyəti; tanıma, fərqləndirə bilmə, ayırd edə bilmə qabiliyyəti; *He showed great discernment in his choice of wine O, şərab seçməkdə böyük qabiliyyət nümayiş etdirdi;* 2. ağıllılıq, fərasətlilik, gözüaçıqlıq; intuisiya *(duyma, sezmə, ürəyə damma);* **a woman of taste and ~** zövqlü və ağıllı / gözüaçıq qadın
**discharge¹** [dɪs'tʃa:dʒ] *n* 1. tərxis olunma, buraxılma *(ordudan); After his discharge from the army, he went to Canada Ordudan tərxis olunduqdan sonra o, Kanadaya getdi;* 2. boşaltma, boşaldılma; **~ of a ship** gəmini boşaltma; **the ~ of a rifle** tüfəngin boşalması; **the accidental ~ of a rifle** tüfəngin təsadüfən açılması; 3. ifrazat; tökmə, boşaltma, buraxma; **~ of water from a lake** suyu göldən buraxma / boşaltma; **nazal ~** burundan gələn ifrazat; 4. yerinə yetirmə, ifa etmə; **~ of *one's* duties** vəzifə borcunu yerinə yetirmə; **in ~ of *one's* functions** vəzifə borcunu yerinə yetirərkən; 5. *hüq.* həbsdən azad etmə; cinayət işini dayandırma; məhkəmənin qərarını ləğv etmə
**discharge²** [dɪs'tʃa:dʒ] *adj:* **~ certificate** əsgərlikdən tərxis olunma haqqında şəhadətnamə; **~ diagnosis** xəstəni evə buraxarkən verilən diaqnoz
**discharge³** [dɪs'tʃa:dʒ] *v* 1. boşaltmaq; **to ~ a ship** gəmini boşaltmaq; 2. boşaltmaq *(tüfəngi və s.)*, atəş açmaq, açılmaq; **to ~ a rifle** tüfəngi boşaltmaq; *The rifle discharged accidentally Tüfəng təsadüfən açıldı;* **to ~ an arrow** ox atmaq; 3. ifraz etmək; püskürmək; tullamaq; buraxmaq, açıb buraxmaq *(suyu, tüstünü və s.);* tökmək, boşaltmaq; *The chimney discharges smoke Bacadan tüstü çıxır/ püskürür; The river discharges its water into the sea Çayın suyu dənizə tökülür;* 4. *məc.* boşaltmaq *(ürəyini);* yüngülləşdirmək; tökmək; **to ~ *one's* conscience** ürəyini boşaltmaq; **to ~ *one's* anger upon *smb.*** acığını bir kəsin üstünə tökmək; 5. *(Əsasən məchul növdə işlənir)* işdən çıxartmaq, vəzifədən azad etmək; *He was discharged from the police force for his illness O, xəstəliyinə görə polis sıralarından azad edildi;* 6. buraxmaq; tərxis etmək; **to ~ a patient from hospital** xəstəni xəstəxanadan buraxmaq; **to ~ a soldier** əsgəri tərxis etmək; **to ~ a prisoner** dustağı buraxmaq / azad etmək; *The accused man was found not guilty and discharged Müttəhim günahsız sayıldı və azadlığa buraxıldı;* 7. ifraz etmək; 8. ləğv etmək *(məhkəmənin qərarını);* **to ~ a court order** məhkəmənin qərarını ləğv etmək
**dischargee** [ˌdɪstʃa:'dʒi:] *n amer.* tərxis olunmuş, əsgərlikdən buraxılmış *(adam)*
**disciple** [dɪ'saɪpl] *n* 1. şagird, davamçı; nümayəndə *(müəyyən məktəbə aid)*, tərəfdar, tərəfkeş; 2. *din.* apostol *(həvariyun, əshabə);* **the twelve ~s** on iki apostol *(İsanın sağlığında onun 12 nəfər tərəfdarı / şagirdi);* 3. *pl* xaçpərəstlər
**discipleship** [dɪ'saɪplʃɪp] *n* şagirdlik
**disciplinable** ['dɪsɪplɪnəbl] *adj* 1. itaətkar, sözəbaxan, üzüyola; 2. cəzalanmalı, cəzaya layiq
**disciplinarian** [ˌdɪsɪplɪ'neərɪən] *n* ciddi / möhkəm intizam tərəfdarı; pedant, xırdaçı; **a good / strict ~** yaxşı/ciddi intizam tərəfdarı
**discipline¹** ['dɪsɪplɪn] *n* 1. intizam, nizam-intizam; **school ~** məktəb intizamı/nizam-intizamı; **military ~** hərbi intizam; **to keep ~** nizam-intizama riayət etmək; **to maintain ~** nizam-intizamı möhkəmlətmək; *The teacher can't keep discipline in his classroom Müəllim sinfində nizam-intizam yarada bilmir;* 2. intizamlılıq, itaət, sözə baxma, itaətkarlıq; **noted for his ~** intizamlılığına/itaətkarlığına görə tanınmış; 3. təlim, məşq, təmrin; *Learning poetry is a good discipline for the memory Şer əzbərləmə yaddaş üçün yaxşı təmrindir;* 4. elm sahəsi, fənn; *History is one of the disciplines studied at school Tarix məktəbdə öyrənilən fənlərdən biridir; You are not good at History, so you'd better choose one of the disciplines Sən/Siz tarixi yaxşı bilmirsən/bilmirsiniz, yaxşı olar ki, başqa fənlərdən birini seçəsən / seçəsiniz;* 5. cəza; *The child needs discipline Bu uşağa cəza vermək lazımdır*
**discipline²** ['dɪsɪplɪn] *v* 1. öyrətmək, öyrənmək; təlim etmək, təhsil vermək; *You must discipline yourself to finish your work on time Sən / Siz işini / işinizi vaxtında qurtarmağı öyrənməlisən / öyrənməlisiniz;* 2. nizam-intizam yaratmaq; *Parents must discipline their children Valideynlər öz uşaqlarına nizam-intizam öyrətməlidirlər;* 3. cəzalandırmaq, cəza vermək; *Anyone who breaks the law will be severely disciplined Qanunu pozan hər bir kəs ciddi cəzalandırılacaqdır*
**disciplined** ['dɪsɪplɪnd] *adj* intizamlı, nizam-intizamlı, itaətli; sözəbaxan; **a ~ pupil** intizamlı şagird; **a ~ team** nizam-intizamlı komanda
**disclaim** [dɪs'kleɪm] *v* 1. imtina etmək, dönmək, üz döndərmək, əl çəkmək; **to ~ an estate** mülk / malikanə hüquqlarından imtina etmək/əl çəkmək; 2. inkar etmək, qəbul etməmək, rədd etmək
**disclaimer** [dɪs'kleɪməʳ] *n* 1. hüquqdan imtina etmə/əl çəkmə; 2. inkar etmə, danma, inkar/rədd etmə /edilmə, etiraz etmə/ edilmə
**disclose** [dɪs'kləuz] *v* 1. açıqlamaq, üstünü açmaq, aşkar etmək, açıq demək; **to refuse to ~ *one's* name** adını açıqlamaqdan imtina etmək/boyun qaçırmaq; *He disclosed the truth that he had been in prison O, açıq dedi ki, həbsxanada olub; The government disclosed that another diplomat has been arrested for spying Hökumət casusluq etdiyinə görə başqa bir diplomatın da həbs edildiyini açıqladı;* 2. açıb göstərmək; **to ~ *one's* intentions** öz niyyətlərini açıb göstərmək; *She opened the box and disclosed its contents O, qutunu açıb içindəkiləri göstərdi*
**disclosure** [dɪs'kləuʒəʳ] *n* 1. açma, açılma; üstünü açma, üstü açılma; **the magazine's ~ of defence secrets** jurnal tərəfindən müdafiə sirlərinin üstünün açılması; 2. açıqlama; **to make ~** açıqlama vermək, açıq demək; *She made several surprising disclosures about her past life O, keçmiş həyatı haqqında bir sıra heyrətamiz açıqlamalar verdi;* **startling ~s about the minister's private life** nazirin şəxsi həyatı haqqında heyrət doğurucu açıqlamalar
**disco** ['dɪskəu] *n (pl -os)* = **discotheque**
**discoloration** [dɪsˌkʌlə'reɪʃn] *n* 1. rəngi qaçma, solma, solğunlaşma, solğunlaşdırma; 2. bozarmış yer, ləkə *(rəngin qaçmasının nəticəsi)*



**discolour** [dɪs'kʌləʳ] *v* 1. rəngini dəyişdirmək; **a dress ~ed by the sun** günəşdən rəngi solmuş paltar; *Smoking discolours the teeth Papiros çəkmək dişlərin rəngini dəyişdirir;* 2. rəngi dəyişmək/ qaçmaq; çirklənmək
**discolouration** [dɪsˌkʌlə'reɪʃn] *n* = **discoloration**
**discoloured** [dɪs'kʌləd] *adj* rəngi dəyişmiş /qaçmış, solğunlaşmış, solğunlaşdırılmış, bozarmış
**discomfit** [dɪs'kʌmfɪt] *v* 1. planı pozmaq, plana şətəl qatmaq / pəl vurmaq; 2. pərt etmək; utandırmaq, karıxdırmaq; *She was rather discomfited when the rain spoiled her new hat Təzə şlyapasını yağış korlayanda, o, xeyli pərt oldu*
**discomfiture** [dɪs'kʌmfɪtʃəʳ] *n* 1. planın pozulması/puça çıxması; 2. özünü itirmə, pərt olma, çaşıb qalma, karıxma
**discomfort¹** [dɪs'kʌmfət] *n* 1. narahatlıq, naqolaylıq; çətinlik; **~ of traffic** yolda hərəkətin çətinliyi; **the ~ of camping in the mountain** dağda düşərgə salmağın narahatlığı/çətinliyi; *She turned red with discomfort when the teacher called out her name Müəllim onun adını çəkəndə, o utandığından qızardı;* 2. *tib.* kefsizlik, naxoşluq; əzginlik, nasazlıq; ağrı; *He still suffers considerable discomfort from his injury O aldığı zədədən hələ də xeyli əziyyət çəkir*
**discomfort²** [dɪs'kʌmfət] *v* narahat etmək, sıxıntı vermək; çətin vəziyyətə/çətinliyə salmaq; *He looks as though nothing has ever discomforted him in his life O elə görünür ki, elə bil ömründə onu heç nə narahat etməyib*
**discomfortable** [dɪs'kʌmfətəbl] *adj* 1. narahat, rahatlığı olmayan, naqolay, narahatlıq yaradan/doğuran; sıxıntı verən, özünü narahat hiss edən; 2. sıxışdırılmış, sıxıntıya salınmış; 3. kədərli, kədərləndirici, qəmləndirici, qüssələndirici
**disconcert** [ˌdɪskən'sə:t] *v* 1. pərt/dilxor etmək, utandırmaq, təşvişə salmaq; həyəcanlandırmaq; çaşdırmaq; *She was disconcerted to hear that she would have to make a speech O, məruzə etməli olduğunu eşidəndə narahat oldu;* 2. pozmaq, şətəl qatmaq, pəl vurmaq *(plana)*
**disconcerted** [ˌdɪskən'sə:tɪd] *adj* 1. pərt edilmiş, utandırılmış, karıxdırılmış; həyəcanlandırılmış, təşvişə salınmış; 2. pozulmuş, puça çıxmış *(plan)*
**disconformity** [ˌdɪskən'fɔ:mɪtɪ] *n* uyğun gəlməmə/olmama, müvafiq olmama, uyğunsuzluq; həqiqətə uyğun olmama, ağla batmama
**disconnect** [ˈdɪskəˈnekt] *v* 1. kəsmək *(suyu, qazı, telefonu və s.):* **to ~ electricity** elektriki kəsmək; **to ~ gas** qazı kəsmək; *If you don't pay your bill, they'll disconnect your gas Əgər sən/siz hesabını/hesabınızı ödəməsən/ödəməsəniz, sənin/sizin qazını/qazınızı kəsəcəklər;* 2. **(from)** ayırmaq, bir-birindən aralamaq; əlaqəsini kəsmək; **to ~ a TV from the power supply** televizoru elektrik xəttindən ayırmaq
**disconnected** [ˌdɪskə'nektɪd] *adj* 1. əlaqəsiz, do-

laşıq, qarışıq; qırıq-qırıq, kəsik-kəsik, rabitəsiz; ~ **speech** əlaqəsiz / dolaşıq nitq; 2. təcrid edilmiş, ayrılmış, tək, ayrı, ayrıca
**disconnectedly** [ˈdıskəˈnektıdlı] *adv* qarışıq, dolaşıq, çaş-baş, qırıq-qırıq, ˈkəsik-kəsik, əlaqəsiz; **to speak** ~ qarışıq/dolaşıq/əlaqəsiz danışmaq
**disconnectedness** [ˈdıskəˈnektıdnıs] *n* qarışıqlıq, dolaşıqlıq, çaş-başlıq; bir-birinə zidlik; qırıqlıq, rabitəsizlik, əlaqəsizlik; təcrid olunma
**disconnection** [ˌdıskəˈnekʃn] *n* = **disconnexion**
**disconnector** [dıskəˈnektəʳ] *n tex.* ayırıcı, kəsən, ayıran *(elektrik cərəyanını)*
**disconnexion** [ˌdıskəˈnekʃn] *n* ayırma, ayrılma; açılma; açma
**disconsolate** [dısˈkɒnsəlıt] *adj* çox kədərli, təsəllisiz, təsəlli tapmayan; çarəsiz, ümidsiz; həsrətli; **her ~ face** onun ümidsiz/kədərli sifəti; *She is disconsolate at the death of her husband O, ərinin ölümündən çox kədərlənib*
**discontent¹** [ˈdıskənˈtent] *n* narazılıq, məmnuniyyətsizlik; narazı olma *(ömrü boyu)*
**discontent²** [ˈdıskənˈtent] *adj* narazı; təmin olunmamış, arzusuna çatmamış
**discontent³** [ˈdıskənˈtent] *v* narazılıq / peşmançılıq yaratmaq, dilxor/peşman etmək
**discontented** [ˈdıskənˈtentıd] *adj* narazı; **to be ~ with *one's* lot / with *one's* position** öz taleyindən/vəziyyətindən narazı olmaq; **~ with *one's* job** işindən narazı
**discontentedly** [ˈdıskənˈtentıdlı] *adv* narazı bir halda / tərzdə
**discontinue** [ˌdıskənˈtınju:] *v* 1. atmaq, kəsmək, dayandırmaq, saxlamaq, nəhayət vermək; **to ~ *one's* work** işini atmaq/ dayandırmaq; **to ~ *one's* habit** adətindən /vərdişindən əl çəkmək; **to ~ a newspaper** qəzetə abunə olmaqdan əl çəkmək / imtina etmək; 2. dayanmaq, kəsilmək, bitmək; *The bus service was discontinued because nobody used it Heç kim istifadə etmədiyinə görə avtobus xidməti dayandırıldı; The publication will discontinue Nəşr dayandırılacaq*
**discontinuity** [ˈdısˌkɒntıˈnju:ıtı] *n* 1. əlaqəsizlik, əlaqənin kəsilməsi, fasilə, prosesdə fasilə; *There's no discontinuity between the past and the present Keçmişlə indi arasında fasilə yoxdur;* 2. qanunauyğunluğun olmaması
**discontinuous** [ˈdıskənˈtınjuəs] *adj* fasiləli, arasıkəsilən, qeyri-müntəzəm; qırıq-qırıq, kəsik-kəsik
**discontinuously** [ˌdıskənˈtınjuəslı] *adv* fasilələrlə, kəsik-kəsik, qırıq-qırıq
**discord¹** [ˈdıskɔ:d] *n* 1. fikir ayrılığı, ixtilaf; ziddiyyət; narazılıq; **~ between brothers/ governments** qardaşlar/dövlətlər arasında narazılıq; 2. ahəngsizlik, disharmoniya *(musiqidə)*
**discord²** [dısˈkɔ:d] *v* 1. razılaşmamaq, müxtəlif fikrə / rəyə malik olmaq; **to ~ with *smb.*** bir kəslə razılaşmamaq; 2. uyğun gəlməmək, müvafiq olmamaq; 3. *mus.* həmahəng olmamaq
**discordance** [dısˈkɔ:dəns] *n* 1. razı olmama, razılaşmama; ixtilaf; narazılıq, nifaq; fikir ayrılığı; 2. dissonans *(ahəngsizlik, səslərdə uyğunsuzluq)*
**discordant** [dısˈkɔ:dənt] *adj* 1. zidd, bir-birinə zidd olan, ziddiyyətli; **~ accounts** ziddiyyətli məlumatlar; **~ views** ziddiyyətli baxışlar/ fikirlər; 2. *mus.* həmahəng olmayan; köklənməmiş *(musiqi aləti haq.)*
**discotheque** [ˈdıskətek] *n* diskoteka; *Is there a good discotheque around here? Bu ətrafda bir yaxşı diskoteka varmı?*
**discount¹** [ˈdıskaunt] *n* 1. *tic.* güzəşt; **to give 10% ~ for cash** nağd pulla ödədikdə 10 % güzəşt etmək; **at a ~** güzəştlə; 2. *mal.* diskont *(veksellərin uçotu);* uçotun faizi
**discount²** [ˈdıskaunt] *v* 1. *mal.* diskont etmək; 2. faizini əvvəldən ödədikdə veksellər borc vermək; 3. aşağı endirmək/salmaq; azaltmaq; 4. korlamaq, xarab etmək; kədərləndirmək, əhvalını pozmaq, qanını qaraltmaq, ovqatını təlx etmək; **to ~ *smb.'s* enjoyment** bir kəsin əhvalını/kefini korlamaq; 5. hesaba /nəzərə almamaq, əhəmiyyət verməmək, məhəl qoymamaq; **to ~ *smb.'s* opinion** bir kəsin rəyini nəzərə almamaq; *You can completely discount what Jack said, he's a dreadful liar Sən/Siz Cəkin dediyini nəzərə almaya bilərsən / bilərsiniz, o yaman yalançıdır*
**discounter** [ˈdıskauntəʳ] *n* diskontçu *(diskontla məşğul olan maliyyə işçisi)*
**discouple** [dısˈkʌpl] *v* ayırmaq, əlaqəsini kəsmək, açmaq *(vaqonu və s.)*
**discourage** [dısˈkʌrıdʒ] *v* 1. ruhdan salmaq, məyus etmək, ümidsizliyə düçar etmək; sarsıtmaq, inamını qırmaq; cəsarətini/mətanətini sarsıtmaq; **to ~ *smb.*** bir kəsi ruhdan salmaq; *His failures discouraged him Uğursuzluqları onu ruhdan saldı;* 2. fikrindən daşındırmaq, əl-qolunu soyutmaq, həvəsdən salmaq, həvəsini öldürmək; *He discouraged them from going to the beach O onların çimərliyə getmək həvəsini öldürdü;* 3. mane olmaq, qarşısını almaq, imkan verməmək; **to ~ *smb.'s* attempts** bir kəsin səylərinin qarşısını almaq; *We discourage smoking in our school Biz məktəbimizdə papiros çəkmənin qarşısını alırıq*
**discouraged** [dısˈkʌrıdʒd] *adj* məyus, ruhdan düşmüş, dilxor, ovqatı təlx; *Mark felt discouraged after losing the match Yarışı uduzduqdan sonra Mark məyus olmuşdu*
**discouragement** [dısˈkʌrıdʒmənt] *n* 1. əl-qolunu soyutma, həvəsdən / ruhdan salma, həvəsini öldürmə; fikrindən daşındırma; 2. ümidsizlik, məyusluq, ruhdan düşmə; **a moment of ~** ümidsizlik / məyusluq anı; 3. maneə, əngəl, çətinlik; müqavimət, əks-təsir; **to meet with ~** müqavimətlə qarşılaşmaq
**discouraging** [dısˈkʌrıdʒıŋ] *adj* kədərləndirici,



məyusedici; **a ~ reply** məyusedici cavab; **a ~ result** məyusedici nəticə
**discouragingly** [dısˈkʌrıdʒıŋlı] *adv* məyuscasına, dilxorcasına, məyus/dilxor halda; sarsılmış/çaşmış vəziyyətdə, ümidini itirmiş vəziyyətdə
**discourse¹** [dısˈkɔ:s] *n* 1. mühazirə, nitq, danışma; **to deliver a ~** nitq söyləmək; *The priest delivered a long discourse on / upon the evils of untruthfulness Keşiş etiqadsızlığın müsibətləri haqqında uzun nitq söylədi;* 2. traktat, elmi əsər; düşüncə, fikir, mühakimə; 3. söhbət, danışıq
**discourse²** [dısˈkɔ:s] *v* 1. natiqlik etmək, fikir söyləmək; **to ~ upon /of *smth.*** bir şey haqqında mühakimə yürütmək; traktat/elmi əsər yazmaq; 2. danışmaq, söhbət etmək; **to ~ on/upon *smth.*** bir şey haqqında danışmaq; *Our teacher discoursed for hours on/upon Greek literature Müəllimimiz yunan ədəbiyyatı haqqında saatlarla danışdı*
**discourteous** [dısˈkə:tjəs] *adj* tərbiyəsiz, ədəbsiz, qaba, kobud, nəzakətsiz; *It was discourteous of you to come late Gec gəlmək sənin/sizin tərəfindən/tərəfinizdən ədəbsizlik idi*
**discourteously** [dısˈkə:tjəslı] *adv* qaba, kobud, tərbiyəsiz, ədəbsiz; **to act ~** tərbiyəsiz / ədəbsiz hərəkət etmək
**discourtesy** [dısˈkə:tısı] *n* tərbiyəsizlik, ədəbsizlik; qabalıq, kobudluq; qaba/kobud hərəkət
**discover** [dısˈkʌvəʳ] *v* 1. kəşf etmək, tapmaq; **to ~ a new island** yeni ada kəşf etmək; *Columbus discovered America in 1492 Kolumb Amerikanı 1492-ci ildə kəşf etdi; He was glad to discover a very good restaurant nearby O, yaxınlıqda yaxşı bir restoran tapdığı üçün sevindi; The microfilm was discovered in a tomato Pomidorun içindən mikrofilm tapıldı;* 2. öyrənmək, bilmək, aşkar etmək; üstünü açmaq; **to ~ a plot** sui-qəsdin üstünü açmaq; *Did you discover who did it? Bunu kimin etdiyini sən / siz öyrəndinmi / öyrəndinizmi? We discovered that our luggage had been stolen Biz öyrəndik ki, baqajımız oğurlanmışdır;* 3. *şahm.*: **to ~ check** şah demək *(fiqur götürməklə)*
**discoverer** [dısˈkʌvərəʳ] *n* tədqiqatçı; ilk kəşf edən
**discovery** [dısˈkʌvərı] *n* 1. kəşf etmə / edilmə, kəşf; **~ of oil** neftin kəşfi; **recent ~** bu yaxınlardakı kəşf; **to make a great ~** böyük kəşf etmək; *The discovery of oil on their land made the family rich Torpaqlarında neftin kəşf olunması ailəni varlandırdı; Researchers have recently made some important new discoveries Tədqiqatçılar son zamanlar bir neçə əhəmiyyətli kəşflər ediblər;* 2. aşkar/müəyyən etmə; aşkar/müəyyən edilmə; aşkar olma; aşkarlanma
**discredit¹** [dısˈkredıt] *n* 1. şübhə, inamsızlıq, etibarsızlıq, etimadsızlıq; **to throw / to cast ~ on** şübhə altına almaq; 2. hörmətdən/etibardan /nüfuzdan salma; biabırçılıq, rüsvayçılıq, üzüqaralıq; **to bring ~ upon oneself** özünü nüfuzdan/hörmətdən salmaq; **to bring *smb.* into ~** bir kəsi hörmətdən salmaq; **to fall / to come into ~** biabır olmaq, özünü hörmətdən salmaq; *That bad boy is a discredit to his family Bu yaramaz oğlan öz ailəsini hörmətdən salır / biabır edir*
**discredit²** [dısˈkredıt] *v* 1. etibar etməmək, şübhələnmək, inanmamaq, şübhə altına almaq; **to ~ a report** məlumata inanmamaq, məlumatı şübhə altına almaq; *There is no reason to discredit what she says Onun dediyinə inanmamağa heç bir əsas yoxdur; The idea that the sun goes round the earth has long been discredited Günəşin yer ətrafına dolanması fikri uzun müddət şübhə altına alınıb;* 2. hörmətdən / nüfuzdan / etibardan / gözdən salmaq, biabır / rüsvay etmək; **to ~ oneself** özünü hörmətdən salmaq, özünü rüsvay etmək
**discreditable** [dısˈkredıtəbl] *adj* hörmətdən /etibardan/nüfuzdan salan, rüsvayçı/biabırçı; **~ tactics** rüsvayçı / biabırçı taktika
**discreditably** [dısˈkredıtəblı] *adv* biabırçılıqla, rüsvayçılıqla, biabırcasına; gülünc
**discreet** [dısˈkri:t] *adj* ehtiyatlı, ehtiyatkar; düşüncəli, dərrakəli, ağıllı; təmkinli, səbrli; təvazökar; **~ diplomat** ehtiyatlı /təmkinli diplomat; *We must be extremely discreet - my husband suspects something Biz son dərəcə ehtiyatlı olmalıyıq, mənim ərim nədənsə şübhələnir*
**discreetly** [dısˈkri:tlı] *adv* ehtiyatla, ehmalla, ehmallıca, ehtiyatkarlıqla; ağılla; **to act ~** ehtiyatla hərəkət etmək; *I saw him glance discreetly at his watch Mən onun ehmallıca saatına baxdığını gördüm*
**discrepance** [dısˈkrepəns] *n* = **discrepancy**
**discrepancy** [dısˈkrepənsı] *n* uyğun gəlməmə, müvafiq olmama, düz gəlməmə; uyğunsuzluq; ayrılıq, fikir ayrılığı, fərq; razı olmama, razılaşmama
**discrepant** [dısˈkrepənt] *adj* uyğun/düz gəlməyən, müvafiq olmama, bir-birinə zidd, bir-birinə düz/uyğun olmayan; fərqli; fərqlənən *(nədənsə)*
**discrete** [dıˈskri:t] *adj* 1. dağınıq, pərakəndə, ayrı-ayrı; **a series of ~ events** bir sıra hadisələr silsiləsi; 2. ayrılmış, ayrı salınmış, əlaqəsi kəsilmiş; mücərrəd, abstrakt
**discretely** [dısˈkri:tlı] *adv* 1. kəsik-kəsik, qırıq-qırıq; 2. tək-tək, ayrı-ayrı, dağınıq / səpələnmiş halda
**discretion** [dısˈkreʃn] *n* 1. ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq; düşüncəlilik, ağıllılıq, düşüncə, dərrakə; ağıl, kamillik, kamal; *She acted with considerable discretion O, çox ağılla / dərrakə ilə hərəkət etdi; This is a secret, but I know I can rely on your discretion Bu sirdir, lakin mən bilirəm ki, sənin / sizin ehtiyatlı olmana / olmanıza ümid edə bilərəm;* **age of ~, years of ~** 1) kamillik dövrü/illəri; 2) yetkinlik/kamillik yaşı; **to act**

with ~ ehtiyatla hərəkət etmək; 2. səlahiyyət, ixtiyar; **large ~** geniş səlahiyyət/ixtiyar; *Use your own discretion Necə istəsən/istəsəniz elə də hərəkət et/ edin; It's within my discretion to go or not Gedib, yaxud getməmək mənim işimdir;*
◊ *Discretion is the better part of valour at. söz.* ≅ *Ehtiyat igidin yaraşığıdır*

**discretionary** [dɪs'kreʃnərɪ] *adj* diskresion *(öz mülahizəsinə görə/istədiyi kimi hərəkət edən)*; **~ decision** diskresion qərar

**discriminate** [dɪs'krɪmɪneɪt] *v* **1.** fərqləndirmək, fərq/təfavüt qoymaq, fərq görmək, seçmək; **to ~ red from scarlet** qırmızını al-qırmızıdan fərqləndirmək; **to ~ between fact and fancy** faktı uydurmadan fərqləndirmək; *The law discriminates between accidental and intentional killing Qanun təsadüfi qətllə qəsdən edilən qətli fərqləndirir; Death does not discriminate, it comes to everyone Ölüm fərq qoymur, o hər kəsi yaxalayır; We don't discriminate people on grounds of age, sex or race Biz adamları yaşına, cinsinə və ya irqinə görə fərqləndirmirik;* **2.** qərəzlə yanaşmaq, qərəzlilik nümayiş etdirmək; ayrı-seçkilik etmək/göstərmək; ayrı-seçkilik siyasəti yeritmək; **to ~ against *smb.*'s friends** bir kəsin dostlarına qərəzlə yanaşmaq; **to ~ in favour of *smb.*** bir kəsə qarşı üzgörənlik/tərəfgirlik etmək

**discriminating** [dɪs'krɪmɪneɪtɪŋ] *adj* **1.** fərqləndirici, fərqlənmə; səciyyəvi; **~ mark** fərqləndirici / səciyyəvi əlamət; **2.** tələbkar, fərqləndirməyi/seçməyi bacaran; **~ customer** tələbkar müştəri /alıcı

**discrimination** [dɪs‚krɪmɪ'neɪʃn] *n* **1.** fərqləndirmə, fərq; **2.** fərqləndirə bilmə qabiliyyəti; **to show ~ in *smth.*** bir şeydən başı çıxmaq; **to show ~ in *one's* choice of friends** dost seçməyi bacarmaq; **3.** ayrı-seçkilik, ögey-doğmalıq, bərabər tutmama; *Pay us all the same! There must be no discrimination Hamımıza eyni əmək haqqı ver/verin! Burada heç bir ayrı-seçkilik olmamalıdır*

**discriminative** [dɪs'krɪmɪnətɪv] *adj* **1.** fərqləndirici; fərqləndirən; səciyyəvi; **~ mark** fərqləndirici/səciyyəvi xüsusiyyət / əlamət; **2.** fərqləndirmə qabiliyyətinə malik olan; ayırd edə bilən

**discrown** [dɪs'kraʊn] *v* taxt-tacdan məhrum etmək; hakimiyyətdən məhrum etmək / devirmək

**discursive** [dɪs'kɜ:sɪv] *adj* qarışıq, dolaşıq, çaşbaş, bir-birinə zidd; ardıcıl olmayan; **to write in a ~ style** dolaşıq/qarışıq üslubda yazmaq; *The play is discursive in style Pyes üslubca dolaşıqdır / qarışıqdır*

**discus** ['dɪskəs] *n (pl həm də* **disci***) id.* **1.** disk *(dairəşəkilli lövhə)*; **2.** disk atma; *Britain did well in discus Disk atma yarışında Britaniya yaxşı çıxış etdi*

**discuss** [dɪs'kʌs] *v* müzakirə/diskussiya etmək; götür-qoy etmək; **to ~ a question /a problem** məsələ/problem müzakirə etmək; *We discussed the problem some days ago Biz bu problemi bir neçə gün bundan öncə müzakirə etdik; Please discuss the question with your father and tell me what you decide Zəhmət olmasa, məsələni atanla/atanızla götür-qoy et/ edin və qərarını/qərarınızı mənə de/ deyin*

**discussion** [dɪs'kʌʃn] *n* müzakirə, diskussiya; mübahisə; **lively/keen/fruitful ~** canlı /kəskin /məhsuldar müzakirə; **heated ~** qızğın müzakirə / diskussiya; **to have / to hold a ~ about *smth.*** bir şeyi müzakirə etmək; **open ~** açıq müzakirə/diskussiya; *The matter will be dealt with in open discussion Məsələyə açıq müzakirədə baxılacaq;* **the question under ~** müzakirə olunan məsələ; *This plan has been under discussion for a year now Bu plan bir ildir ki, müzakirə olunmaqdadır*

**disdain**[1] [dɪs'deɪn] *n* nifrət; etinasızlıq, saymazlıq, saygısızlıq, laqeydlik, etinasızlıq/ saygısızlıq göstərmə; **to treat *smb.* with ~** bir kəsə etinasızlıq/laqeydlik göstərmək

**disdain**[2] [dɪs'deɪn] *v* **1.** nifrət etmək, alçaq nəzərlə/xor/həqarətlə baxmaq; etina etməmək, məhəl qoymamaq, laqeydlik göstərmək; **to ~ flattery** yaltaqlığa nifrət etmək; *Why do you disdain my offer of friendship Sən/Siz nə üçün mənim dostluq haqqındakı təklifimə məhəl qoymursan/qoymursunuz;* **2.** öz ləyaqətindən aşağı hesab etmək; rəva bilməmək, özünə sığışdırmamaq; *He disdains to sit / to have dinner with people like us O bizim kimi adamlarla oturmağı / nahar etməyi özünə rəva bilmir*

**disdainful** [dɪs'deɪnfl] *adj* **1.** nifrətli, nifrət ifadə edən, həqarətli; **2.** etinasız, saymaz, saygısız, laqeyd, lovğa, təkəbbürlü, dikbaş; **a ~ smile** lovğa/təkəbbürlü təbəssüm; **a ~ look** nifrətli / təkəbbürlü baxış; **a ~ air** təkəbbürlü/saygısız/lovğa görkəm; *She gave me a disdainful smile O mənə təkəbbürlə gülümsədi*

**disdainfully** [dɪs'deɪnfulɪ] *adv* təkəbbürlə, lovğa-lovğa, saygısızyana; *He spoke of his success disdainfully O, nailiyyətlərindən təkəbbürlə / lovğa-lovğa danışdı*

**disease** [dɪ'zɪ:z] *n* xəstəlik; **infectious ~s** yoluxucu xəstəliklər; **~ of childhood** uşaq xəstəliyi; **to suffer from a ~** xəstəlikdən əziyyət/əzab çəkmək; **to spread ~** xəstəlik yaymaq; **to prevent ~** xəstəliyin qarşısını almaq; **heart ~** ürək xəstəliyi; **serious ~** ciddi xəstəlik; **incurable ~** sağalmaz xəstəlik; *Cancer is an incurable disease Xərçəng sağalmaz xəstəlikdir;* **to catch a ~** xəstəliyə tutulmaq; **to cure a ~** xəstəliyi sağaltmaq; **plant ~s** bitki xəstəlikləri; *Wound is not a disease Xora xəstəlik deyil;* **~s of society** *məc.* cəmiyyətin xəstəlikləri



**diseased** [dɪ'zɪ:zd] *adj* xəstə, xəstələnmiş; **~ kidneys** xəstə / xəstələnmiş böyrəklər; **a ~ bone** xəstə sümük; **~ plants** xəstə bitkilər; **a ~ society** *məc.* xəstə cəmiyyət; **~ imagination** xəstə təxəyyül / təsəvvür

**disembark** ['dɪsɪm'ba:k] *v* **1.** boşaltmaq; endirmək, düşürmək *(yükü)*; **2.** düşmək; düşürmək; *Passengers may disembark from the plane by the front or rear doors Sərnişinlər təyyarənin ön / qabaq və ya arxa qapısından düşə bilərlər*

**disembarkation** [‚dɪs.emba:'keɪʃn] *n* **1.** düşmə, enmə; düşürülmə, endirilmə; *After disembarkation, we went through passport control Düşdükdən sonra biz pasport yoxlamasından keçdik;* **2.** boşaltma, boşaldılma *(yükü gəmidən)*

**disembarrass** ['dɪsɪm'bærəs] *v* çətinlikdən çıxartmaq; azad / xilas etmək, qurtarmaq

**disembodied** [‚dɪsɪm'bɒdɪd] *adj* bədəndən ayrılmış

**disembody** ['dɪsɪm'bɒdɪ] *v* **1.** buraxmaq; ləğv etmək; **2.** *din.* bədəndən ayırmaq

**disembowel** [‚dɪsɪm'baʊəl] *v* içalatını təmizləmək / çıxartmaq

**disemploy** ['dɪsɪm'plɔɪ] *v* azad/kənar etmək, çıxartmaq *(işdən, vəzifədən)*

**disenable** [‚dɪsɪn'eɪbl] *v* bacarıqsız/qabiliyyətsiz etmək

**disenchant** ['dɪsɪn'tʃa:nt] *v* cadudan/sehrdən azad etmək

**disengage** ['dɪsɪn'geɪdʒ] *v* **1.** azad etmək, buraxmaq, ayırmaq, seçmək; **to ~ *one's* hand** əlini azad etmək / buraxmaq; **to ~ oneself from an obligation** özünü məsuliyyətdən azad etmək; *He finally managed to disengage himself from her embrace Nəhayət o, özünü onun ağuşundan azad edə bildi;* **to ~ truth from a mass of lies** həqiqəti bir yığın yalandan ayırmaq; **2.** azad/xilas olmaq; boşalmaq, yaxa qurtarmaq, çıxmaq; **3.** *hərb.* düşməndən aralanmaq, vuruşdan/döyüşdən çıxmaq; ordunu çıxarmaq *(döyüşdən)*

**disengaged** ['dɪsɪn'geɪdʒd] *adj* azad, boş, məşğul olmayan; *Are you disengaged this evening? Sən/Siz bu axşam boşsanmı / boşsunuzmu?*

**disengagement** [‚dɪsɪn'geɪdʒmənt] *n* **1.** azad etmə /olma/edilmə, buraxma, buraxılma; xilas etmə/edilmə/olma, qurtarma, nicat vermə; **2.** azadlıq, azad olma *(dərsdən, işdən və s.)*; **~ from influence** təsirdən azad olma; **3.** nişanı qaytarma; **4.** *hərb.* döyüşdən / vuruşdan çıxma, düşməndən aralanma; dövlətlərin hərbi qüvvələrinin qarşılıqlı çıxarılması *(müəyyən zonadan, ərazidən)*; ayırma

**disentangle** [‚dɪsɪn'tæŋgl] *v* **1.** açmaq, açıb / çəkib çıxartmaq; çıxartmaq, qurtarmaq *(çətin/çıxılmaz vəziyyətdən)*; azad etmək; **2.** seçmək, ayırd etmək; **to ~ a few facts from a mass of fable** bir neçə faktı bir aləm uydurmanın içindən seçmək / ayırd etmək; *How can I disentangle the truth from all these lies? Həqiqəti mən bu yalanlar içindən necə ayırd edə bilərəm?* **3.** açmaq *(dolaşığı, düyünü)*; **to ~ a knot** düyünü açmaq

**disentanglement** [‚dɪsɪn'tæŋglmənt] *n* **1.** açma, açıb çıxartma; azad etmə; **2.** açma *(dolaşığı / düyünü)*; **3.** çıxma, azad olma *(çətin / çıxılmaz vəziyyətdən)*

**disestablish** ['dɪsɪs'tæblɪʃ] *v* **1.** ləğv etmək, geri götürmək; **2.** kilsəni dövlətdən ayırmaq

**disestablishment** [‚dɪsɪs'tæblɪʃmənt] *n* **1.** ləğv etmə / edilmə; **2.** kilsəni dövlətdən ayırma

**disfavor** ['dɪs'feɪvə<sup>r</sup>] *n* = **disfavour**

**disfavour** ['dɪs'feɪvə<sup>r</sup>] *n* **1.** bəyənməmə, pisləmə; məzəmmət, töhmət; ədavət, kin, düşmənçilik; sevməmə; **to regard *smb.* with ~** bir kəsi sevməmək/bəyənməmək; **2** gözdən salma / düşmə; etibardan düşmə; **to fall/ to come into ~** gözdən düşmək, etibarını itirmək; *He fell into disfavour with prime minister and was sacked from the Cabinet O, baş nazirin gözündən düşdü və kabinetin tərkibindən çıxarıldı;* **3.** zərər, ziyan; **to / in (the) ~ of *smb.*** bir kəsin ziyanına / zərərinə, bir kəsin əleyhinə

**disfigure** [dɪs'fɪgə<sup>r</sup>] *v* eybəcərləşdirmək, çirkinləşdirmək, eybəcər hala salmaq, korlamaq, təhrif etmək; **to ~ a face** sifəti eybəcər hala salmaq; *Those spots on her face are very disfiguring Üzündəki ləkələr onun sifətini çirkinləşdirir / eybəcər hala salır;* **a beautiful landscape ~d by a power station** elektrik stansiyası tərəfindən korlanmış gözəl mənzərə; *The accident disfigured him for life Bədbəxt hadisə onu ömürlük eybəcər hala saldı*

**disfigured** [dɪs'fɪgəd] *adj* eybəcərləşdirilmiş, çirkinləşdirilmiş, eybəcər hala salınmış; korlanmış, təhrif edilmiş; **~ face** eybəcərləşdirilmiş / eybəcər hala salınmış sifət

**disfigurement** [dɪs'fɪgəmənt] *n* **1.** eybəcərləşdirmə, çirkinləşdirmə, eybəcər hala salma; təhrif etmə; **2.** eybəcərlik, kifirlik, çirkinlik, biçimsizlik; **3.** zərər, ziyan

**disforest** [dɪs'fɒrɪst] *v* meşəni qırmaq, meşəsizləşdirmək

**disgorge** [dɪs'gɔ:dʒ] *v* **1.** püskürmək; qusmaq, geri qaytarmaq; **to ~ lava** lava püskürmək; **2.** geri vermək, qaytarmaq *(qanunsuz əldə edilmiş bir şeyi)*; **to ~ property** qanunsuz əldə edilmiş malikanəni geri qaytarmaq; **3.** boşaltmaq; boşalmaq; *The ship disgorged itself Gəmi yükünü boşaltdı;* **4.** tökülmək; axıb qarışmaq; **to ~ into a lake** gölə tökülmək

**disgown** [dɪs'gaʊn] *v* **1.** *şair.* soyundurmaq; **2.** *kils.* dini addan məhrum etmək; dini adı üzərindən atmaq

**disgrace**[1] [dɪs'greɪs] *n* **1.** rüsvayçılıq, biabırçılıq, bədnamlıq, üzüqaralıq; **to bring ~ upon *smb.*** bir kəsi rüsvay / biabır etmək; *You are a disgrace to your family Sən / Siz ailəni / ailənizi*

*rüsvay edirsən /edirsiniz; His behaviour has brought disgrace on himself Onun davranışı onun özünü rüsvay / biabır edib;* 2. gözdən / etibardan düşmə; 3. eyib, eyiblik; *Being poor is no disgrace Kasıblıq eyib deyil*

**disgrace²** [dɪs'greɪs] *v* 1. biabır/rüsvay/bədnam etmək; ləkələmək; **to ~ oneself** özünü biabır/rüsvay etmək; *He got drunk and disgraced himself at the wedding O, sərxoş oldu və özünü toyda rüsvay/biabır etdi;* 2. hörmətdən/etibardan düşmək; etibardan/gözdən salmaq; 3. *hərb.* rütbəsini aşağı salmaq; **to ~ an officer** zabitin rütbəsini aşağı salmaq

**disgraceful** [dɪs'greɪsful] *adj* biabırçı, eyibli, rüsvayçı; **~ behaviour** biabırçı/ rüsvayçı davranış; *It's disgraceful that a town of this size should not have a single decent hotel Bu böyüklükdə şəhərdə qəşəng bir mehmanxananın olmaması rüsvayçılıqdır*

**disgracefully** [dɪs'greɪsfəlɪ] *adv* biabırçılıqla, rüsvayçılıqla; biabırcasına; **to bahave ~** özünü biabırcasına aparmaq

**disgruntle** [dɪs'grʌntl] *v* narazılıq törətmək, acıqlandırmaq, hirsləndirmək

**disgruntled** [dɪs'grʌntld] *adj* narazı, acıqlı, hirsli; acıqlandırılmış, hirsləndirilmiş; qıcıqlandırılmış; **a ~ look** narazı / acıqlı / hirsli baxış

**disguise¹** [dɪs'gaɪz] *n* 1. maskalama, maskalanma; ört-basdır etmə / edilmə; pərdələmə, pərdələnmə; gizlətmə; **to make no ~ of *one's* feelings** öz hisslərini gizlətməmək; **to grow a beard as a ~** maskalanmaq üçün saqqal qoymaq; *The thief wore a false beard as a disguise Oğru masklanmaq üçün saxta saqqal qoymuşdu* 2. maska, dəyişdirilmiş xarici görünüş, dəyişdirilmiş kostyum; **a peasant in ~** başqa paltar geyinmiş kəndli; 3. aldadıcı görkəm, iç üz, əsl sifət; üstüörtülü; **a reproach in ~** gizli / üstüörtülü məzəmmət; **to throw off all ~** maskasını atmaq, iç üzünü göstərmək; 4. ikiüzlülük, riyakarlıq, yalan, hiylə, kələk, fırıldaq; **to speak without ~** açıq danışmaq, riyakarlıq etməmək; *He's a master of disguise O, riyakarlıq mücəssəməsidir*

**disguise²** [dɪs'gaɪz] *v* 1. maskalamaq, maska taxmaq *(üzünə);* gizlətmək *(hərbi obyektləri və s.);* ört-basdır etmək, pərdələmək, dəyişdirmək; paltarını dəyişmək / dəyişdirmək; qiyafəsini dəyişmək; **to ~ *one's* feelings / intentions** öz hisslərini / niyyətlərini gizlətmək; **to ~ oneself in a woman's dress** qadın paltarı geyməklə maskalanmaq; **to ~ oneself as a monk** monax kimi geymək; **to ~ oneself with a false beard** saxta saqqal taxmaqla / geyməklə xarici görkəmini dəyişmək; **to ~ *one's* voice** səsini dəyişmək; *She disguised herself as a man, but she couldn't disguise her voice O, özünü kişi qiyafəsinə saldı, lakin səsini dəyişdirə bilmədi; He disguised his voice very cleverly O, səsini çox məharətlə dəyişdi; I couldn't disguise my anger Mən acığımı / hirsimi / qəzəbimi gizlədə bilmədim;* 2. təhrif etmək, gizlətmək; **to ~ truth** həqiqəti təhrif etmək; 3. örtmək, örtülmək; **to be ~d with snow** qarla örtülmək

**disguised** [dɪs'gaɪzd] *adj* 1. paltarını dəyişmiş, başqa paltar geymiş; 2. maskalanmış, maska geymiş; üzünə maska taxmış; maskarad paltarı geymiş; maskalı; 3. *d.d.* sərxoş, kefli

**disgust¹** [dɪs'gʌst] *n* nifrət; ikrah; **to excite ~ in *smb.*** bir kəsdə nifrət/ikrah oyatmaq; **to do *smth.* in ~** bir şeyi ikrah hissi ilə etmək; *The idea of smoking fills me with disgust Papiros çəkmək fikri məndə nifrət / ikrah oyadır; The food at the hotel filled him with disgust Mehmanxanadakı yemək onda ikrah doğurdu*

**disgust²** [dɪs'gʌst] *v* nifrət / ikrah oyatmaq; *This smell disgusts me Mən bu iyə dözə bilmirəm; His action disgusted everybody Onun hərəkəti hamıda ikrah doğurdu*

**disgusted** [dɪs'gʌstɪd] *adj* nifrət /ikrah hiss edən; *I'm disgusted with myself Mən özüm-özümə nifrət edirəm*

**disgustedly** [dɪs'gʌstɪdlɪ] *adv* nifrətlə, ikrahla, nifrət / ikrah hissilə

**disgustful** [dɪs'gʌstful] *adj* = **disgusting**

**disgusting** [dɪs'gʌstɪŋ] *adj* çox pis, iyrənc, çirkin, mənfur, murdar; **~ habits** iyrənc / mənfur / murdar vərdişlər; **~ food** çox pis / iyrənc yemək; *The food at school is disgusting Məktəbdə yemək çox pisdir*

**disgustingly** [dɪs'gʌstɪŋlɪ] *adv* çox pis, iyrənc / mənfur bir tərzdə

**dish¹** [dɪʃ] *n* 1. qab; **a glass ~** şüşə qab; **an oven-proof ~** odadavamlı/istiyədavamlı qab; 2. boşqab, dövrə, iri nimçə; **the ~es** *top.i* qab-qacaq; **to wash/to dry/to put away the ~es** qab-qacağı yumaq/qurutmaq/yığışdırmaq; *I'll do the dishes Mən qab-qacağı yuyacam;* 3. yemək, xörək; **a big ~** zəngin / çox yemək; **vegetable / meat ~** tərəvəz / ət xörəyi; **cold /plain /dainty ~** soyuq/sadə / zərif yemək; **to serve a ~** yemək vermək

**dish²** [dɪʃ] *v* 1. *(daha çox* **to ~ up***)* qaba qoymaq; stola xörək vermək; **to ~ (up) a meal** stola xörək vermək; *Can you dish everything out for me? Yemək üçün mənə hər şey verə bilərsənmi/bilərsinizmi?* 2. ayağı ilə yeri eşmək *(at haq.);* 3. aldatmaq; tovlamaq, kələk/hiylə / fırıldaq gəlmək; ələ salmaq, oynatmaq; **to ~ *one's* political opponents** siyasi rəqiblərini aldatmaq; 4. qarışdırmaq, dolaşdırmaq, qatışdırmaq; məhv / tələf etmək; **to ~ *smb.'s* schemes** bir kəsin planını dolaşdırmaq; *This will dish him Bu onu məhv edəcək*

**disharmonize** [dɪs'ha:mənaɪz] *v* 1. ahəngi pozmaq / korlamaq; 2. düz / uyğun gəlməmək; həmahəng olmamaq



**disharmony** ['dɪs'ha:mənɪ] *n* 1. disharmoniya, ahəngsizlik, ahəng pozğunluğu; uyğunsuzluq; 2. *məc.* ixtilaf, anlaşılmazlıq, narazılıq; fikir ayrılığı; **to bring ~ into the family** ailəyə ixtilaf / narazılıq salmaq; *There was almost no disharmony in their marriage Demək olar ki, onların izdivacında heç bir narazılıq yox idi*

**dishcloth** ['dɪʃklɔθ] *n* 1. mətbəx dəsmalı/ məhrəbası; 2. qab yumaq üçün əsgi/cındır

**dishearten** [dɪs'ha:tn] *v* həvəsdən / ruhdan salmaq, məyus/ümidsiz etmək, cəsarətsizləşdirmək; iradəsini sındırmaq; *Don't be disheartened by this failure Bu uğursuzluğa görə həvəsdən düşmə/düşməyin; This bad news will dishearten them Bu bəd xəbər onları ruhdan salacaq*

**disheartened** [dɪs'ha:tnd] *adj* həvəsdən/ ruhdan salınmış, məyus edən; **to feel a bit ~** bir az həvəsdən / ruhdan düşmək, cəsarətsizləşmək; **a ~ attitude** ümidsiz münasibət

**disheartening** [dɪs'ha:tnɪŋ] *adj* həvəsdən / ruhdan salan, məyus edən; **~ news** məyus edən xəbər

**disheartenment** [dɪs'ha:tnmənt] *n* ümidsizlik, məyusluq; qəm, kədər, hüzn, qüssə; cəsarətini / mərdliyini / mətanətini itirmə

**dishevel** [dɪ'ʃevəl] *v* 1. əzmək *(paltarı);* 2. qarışdırmaq, pırtlaşdırmaq, dolaşdırmaq *(saçı)*

**disheveled** [dɪ'ʃevəld] *adj* = **dishevelled**

**dishevelled** [dɪ'ʃevəld] *adj* 1. əzilmiş, dağılmış *(paltar və s.);* 2. dağınıq, pərişan, pırtlaşdırılmış, pırtlaşıq *(saç);* **~ hair** pırtlaşıq saç

**dishonest** [dɪs'ɔnɪst] *adj* 1. namussuz, şərəfsiz; əyri, ləyaqətsiz, pozğun, yaramaz, fırıldaqçı, hiyləgər, dələduz, vicdansız, insafsız, utanmaz, həyasız; **a ~ trader** dələduz/fırıldaqçı alverçi; **~ profit** əyri gəlir/mənfəət/qazanc; **a ~ partner** hiyləgər partnyor; **a ~ politician** ləyaqətsiz/hiyləgər /utanmaz /dələduz siyasətçi; 2. pis, səliqəsiz, keyfiyyətsiz; səhlənkar, işə can yandırmayan; **a ~ worker** səhlənkar / işə can yandırmayan işçi

**dishonestly** [dɪs'ɔnɪstlɪ] *adv* vicdansızcasına, şərəfsizcəsinə, ləyaqətsizcəsinə, yaramazcasına, həyasızcasına, utanmadan

**dishonesty** [dɪs'ɔnɪstɪ] *n* 1. namussuzluq, şərəfsizlik, ləyaqətsizlik, tərbiyəsizlik, yaramazlıq; vicdansızlıq, insafsızlıq; utanmazlıq, həyasızlıq; 2. yalan, hiylə, kələk, fırıldaq; aldatma

**dishonor** [dɪs'ɔnəʳ] *n amer.* = **dishonour¹ ²**

**dishonorable** [dɪs'ɔnərəbl] *adj amer.* = **dishonourable**

**dishonorably** [dɪs'ɔnərəblɪ] *adv amer.* = **dishonourably**

**dishonored** [dɪs'ɔnəd] *adj amer.* = **dishonoured**

**dishonour¹** [dɪs'ɔnəʳ] *n* 1. namussuzluq, biabırçılıq, rüsvayçılıq, həqarət, təhqir; **to incur / to bring ~ upon *smb.*** bir kəsi biabır /rüsvay etmək; **to bring ~ on *one's* family** ailəsinə rüsvayçılıq gətirmək; 2. biabırçı / rüsvayçı ləkə, üzqarası; *He is a dishonour to his country/family O, vətəninə/ailəsinə ləkədir;* 3. təhqir; eyiblilik, alçaqlıq; *This work offers you no dishonour Bu iş sənə əsla alçaqlıq gətirmir*

**dishonour²** [dɪs'ɔnəʳ] *v* 1. ləkələmək, biabır /rüsvay etmək, abırdan salmaq, bədnam etmək; **to ~ *one's* name** özünü biabır/rüsvay etmək; adını ləkələmək; 2. dönmək, danmaq, inkar etmək; **to ~ *one's* word** sözündən dönmək; **to ~ *one's* promise** vədindən qaçmaq / dönmək; **to ~ *one's* signature** imzasından imtina etmək; 3. təhqir etmək, ləyaqətini alçaltmaq

**dishonourable** [dɪs'ɔnərəbl] *adj* 1. biabırçı, rüsvayçı, eyibli; utanmalı, əttökən; **~ action** biabırçı/əttökən/rüsvayçı hərəkət; **a ~ discharge from the army** ordudan biabırcasına / rüsvaylıqla qovulma; 2. şərəfsiz; arsız, abırsız; əclaf, xəbis, rəzil, murdar, alçaq *(adam haq.)*

**dishonourably** [dɪs'ɔnərəblɪ] *adv* şərəfsizcəsinə, abırsızcasına, arsızcasına, biabırçılıqla, rüsvayçılıqla

**dishonoured** [dɪs'ɔnəd] *adj* biabır / rüsvay edilmiş, biabır/rüsvay olmuş, ləkələnmiş

**dishorn** [dɪs'hɔ:n] *v k.t.* buynuzunu kəsmək

**dishtowel** ['dɪʃtauəl] *n* çay / qab dəsmalı

**dish-wash** ['dɪʃwɔʃ] *n* çirkab, çirkli su, qab suyu, yaxantı

**dish-washer** ['dɪʃwɔʃəʳ] *n* qabyuyan; qabyuyan maşın

**dishwater** ['dɪʃwɔ:təʳ] *n* 1. qab yumaq üçün su; 2. *məc.* qab suyu *(dadsız xörək və s. haq.); This coffee tastes like dishwater Bu kofe/qəhvə qab suyu dadır*

**dishy** ['dɪʃɪ] *adj* fiziki baxımdan / bədəncə cazibəli *(kişi haq.)*

**disillusion¹** [.dɪsɪ'lu:ʒn] *n* ümidi kəsilmə / boşa çıxma, məyus olma; ümidsizlik; həvəsdən düşmə

**disillusion²** [.dɪsɪ'lu:ʒn] *v* naümid /məyus etmək, ümidini boşa çıxartmaq, əlini soyutmaq, həvəsdən salmaq; illüziyanı dağıtmaq

**disillusionment** [.dɪsɪ'lu:ʒənmənt] *n* ümidsizlik, məyusluq, əli soyuma; ümidi kəsilmə/boşa çıxma, məyus olma, həvəsdən düşmə

**disimprison** [.dɪsɪm'prɪzn] *v* azad etmək, buraxmaq *(həbsdən)*

**disimprove** [.dɪsɪm'pru:v] *v* xarab etmək, korlamaq, pisləşdirmək; korlanmaq, pisləşmək, xarab olmaq

**disinclination** [.dɪsɪnklɪ'neɪʃn] *n* meylsizlik, istəməmə, meyli olmama, həvəssizlik, xoşlamama, xoşa gəlməmə, ürəyə yatmama; **~ to meet *smb.*** bir kəslə görüşməyi istəməmə/xoşlamama; **a ~ to travel at night** gecə səyahət etməyə meyli olmama; **to have a ~ for *smth.*** bir şeyə həvəs / meyl göstərməmə; **to show a ~ to / for *smb.*** bir kəsdən xoşu gəlməmək, bir kəsə meyl göstərməmək

**disincline** [ˈdɪsɪnˈklaɪn] *v* həvəsdən salmaq, həvəsini öldürmək/soyutmaq; ikrah təlqin etmək; *He felt disinclined for/to sleep Onun yatmağa meyli / həvəsi yox idi*

**disincorporate** [ˈdɪsɪnˈkɔ:pəreɪt] *v* buraxmaq, bağlamaq *(cəmiyyəti və s.)*

**disinfect** [ˌdɪsɪnˈfekt] *v* dezinfeksiya etmək

**disinfectant** [ˌdɪsɪnˈfektənt] *n* dezinfeksiya dərmanı

**disinfection** [ˌdɪsɪnˈfekʃn] *n* dezinfeksiya *(xüsusi dərmanlar vasitəsilə yoluxucu mikrobların məhv edilməsi və ya zərərsizləşdirilməsi)*

**disinfector** [ˌdɪsɪnˈfektəʳ] *n* dezinfeksiya edən cihaz / aparat

**disinformation** [ˌdɪsɪnfəˈmeɪʃn] *n* yalan məlumat, yalan məlumat verməklə çaşdırma *(xüs. dövlət tərəfindən)*

**disingenuity** [ˌdɪsɪndʒɪˈnju:ɪtɪ] *n* səmimiyyətsizlik, ikiüzlülük; sünilik, qeyri-səmimilik

**disingenuous** [ˌdɪsɪnˈdʒenjuəs] *adj* səmimiyyətsiz, qeyri-səmimi, ikiüzlü; *It was disingenuous of him to praise me just because he wanted money from me Məndən pul almaq üçün onun məni tərifləməsi sadəcə olaraq riyakarlıq idi*

**disingenuously** [ˌdɪsɪnˈdʒenjuəslɪ] *adv* qeyri-səmimi, ikiüzlülüklə, qeyri-səmimi / ikiüzlü bir tərzdə

**disingenuousness** [ˌdɪsɪnˈdʒenjuəsnɪs] *n* = **disingenuity**

**disinherit** [ˈdɪsɪnˈherɪt] *v* varislikdən məhrum etmək; *The king disinherited his elder son Kral böyük oğlunu varislikdən məhrum etdi*

**disinheritance** [ˌdɪsɪnˈherɪtəns] *n* varislikdən məhrum etmə

**disintegrate** [dɪsˈɪntɪgreɪt] *v* **1.** parça-parça olmaq, parçalanmaq; *The plane fell into the mountain and disintegrated Təyyarə dağa düşdü və parça-parça oldu;* **2.** xırdalamaq, parçalamaq, doğramaq; parçalanmaq, xırdalanmaq, tərkib hissələrinə ayrılmaq; **3.** zəifləmək, birliyini itirmək; dağılmaq; *The family is starting to disintegrate Ailə dağılmağa başlayır;* **4.** *kim.* hissələrə ayırmaq *(kimyəvi reaksiya vasitəsilə)*

**disintegration** [dɪsˌɪntɪˈgreɪʃn] *n* **1.** dezinteqrasiya *(bütövün öz tərkib hissələrinə parçalanması);* **2.** xırdalama, xırdalanma; parçalama, parçalanma; doğrama, doğranma; **3.** tərkib hissələrinə ayırma/ayrılma; **4.** dağılma, məhv olma, parçalanma, pozulma, süqut; **the ~ of the colonial system** müstəmləkə sisteminin dağılması / süqutu; **the gradual ~ of traditional values** ənənəvi dəyərlərin tədrici məhv olması; **5.** *kim. fiz.* parçalanma; **nuclear ~** nüvənin parçalanması

**disinter** [ˌdɪsɪnˈtəʳ] *v* **(-rr-) 1.** qazıb çıxartmaq *(xüs. meyiti)*; eşmək; **permission to ~ the body** meyiti qazıb qəbirdən çıxartmaq üçün icazə; **2.** *məc.* eşələyib çıxartmaq; **to ~ an old scandal** köhnə palan içi sökmək

**disintrest** [dɪsˈɪntrəst] *n* maraqsızlıq

**disintrested** [dɪsˈɪntrəstɪd] *adj* marağı/mənfəəti olmayan; təmənnasız, qərəzsiz, şəxsi mənfəəti olmayan; **~ help** təmənnasız kömək; **a ~ act of kindness** təmənnasız / qərəzsiz xeyirxahlıq

**disintrestedly** [dɪsˈɪntrəstɪdlɪ] *adv* təmənnasız, tamahsız, təmənnasız/tamahsız olaraq

**disinterment** [ˌdɪsɪnˈtə:mənt] *n* qəbirdən çıxartma; ekshumasiya *(məhkəmə tibbi müayinə üçün meyitin qəbirdən çıxarılması)*

**disjoin** [dɪsˈdʒɔɪn] *v* ayırmaq, əlaqəsini kəsmək; ayrılmaq, əlaqəsi kəsilmək

**disjoint** [dɪsˈdʒɔɪnt] *v* **1.** bölmək; ayırmaq; parçalamaq; **2.** kəsmək *(toyuğu, ördəyi və s.); Disjoint this duck Bu ördəyi kəs/kəsin;* **3.** kəsilmək, doğranmaq; ayırmaq *(tərkib hissələrinə);* sökmək; sökülmək

**disjointed** [dɪsˈdʒɔɪntɪd] *adj* **1.** ayrılmış *(tərkib hissələrinə);* parçalanmış; **2.** rabitəsiz, qarışıq, bir-birilə uyuşmayan *(fikir, nitq haq.);* **a ~ film** rabitəsiz/qarışıq film; *The film was so disjointed that I couldn't tell him what the story was about Film o qədər dolaşıq idi ki, əhvalatın nə barədə olduğunu ona danışa bilmədim*

**disjointedly** [dɪsˈdʒɔɪntɪdlɪ] *adv* rabitəsiz, əlaqəsiz, dolaşıq, adda-budda, məntiqsiz; **to speak ~** rabitəsiz / məntiqsiz danışmaq

**disjointedness** [dɪsˈdʒɔɪntɪdnɪs] *n* rabitəsizlik, əlaqəsizlik, dolaşıqlıq, münasibətsizlik

**disjunct** [dɪsˈdʒʌŋkt] *adj* ayrılmış, *(tərkib hissələrinə);* parçalanmış; ayrı, ayrı-ayrı

**disjunction** [dɪsˈdʒʌŋkʃn] *n* **1.** ayırma, ayrılma; tərkib hissələrinə ayırma / ayrılma, parçalama, parçalanma; **2.** *tex.* ayırma, əlaqəsini kəsmə

**disjunctive** [dɪsˈdʒʌŋktɪv] *adj* **1.** ayıran, ayırıcı, discanktiv; **~ question** *qram.* ayırıcı / discanktiv sual; **2.** bölüşdürmə; **~ conjunctions** bölüşdürmə bağlayıcıları

**disk** [dɪsk] *n* **1.** disk; halqa; dairəşəkilli lövhə; **2.** qrammofon/patefon valı; **3.** *id. d.d.* şayba *(buz üzərində hokkey oyununda top əvəzinə işlədilən ağır rezin dairə)*

**dislike**[1] [dɪsˈlaɪk] *n* meylsizlik, istəməmə, xoşlamama, xoşu gəlməmə, ürəyi yatmama; ədavət, sevməmə, qərəz; antipatiya *(xoşa gəlməmə)*; **likes and ~s** simpatiya və antipatiya; *He soon got to know the girl's likes and dislikes Tezliklə o, qızın nədən xoşu gəldiyini və nədən xoşu gəlmədiyini öyrəndi;* **to show a strong ~ for/to/of** ***smb.*** bir kəsdən zəhləsi getmək / xoşu gəlməmək; *I have a strong / hearty dislike of modern music Mənim müasir musiqidən lap zəhləm gedir*

**dislike**[2] [dɪsˈlaɪk] *v* xoşlamamaq, xoşu gəlməmək, zəhləsi getmək, sevməmək; **to ~** ***smb./smth.*** bir kəsi/şeyi xoşlamamaq, bir kəsdən / şeydən zəhləsi getmək; *I like cats but dislike dogs Mənim pişiklərdən xoşum gəlir, lakin itlərdən zəhləm gedir;* **to ~ going away from home** evdən başqa yerə getməyi sevməmək; *I dislike this man Bu adam mənim xoşuma gəlmir*



**dislocate** [ˈdɪsləkeɪt] *v* **1.** *tib.* çıxartmaq, burxutmaq; **to ~** ***one's*** **ankle** topuğunu burxutmaq/çıxartmaq; **2.** pozmaq, riayət/ əməl etməmək; şətəl qatmaq, pəl vurmaq; **to ~ traffic** hərəkəti pozmaq; **to ~ affairs** işləri korlamaq

**dislocation** [ˌdɪsləˈkeɪʃn] *n* **1.** *tib.* çıxıq; *She was treated for a dislocation Onu çıxıqdan müalicə etdilər;* **2.** pozma, pozulma; qaydasızlıq, pozğunluq, qarışıqlıq; *These policies will cause severe economic and social dislocation for future generations Bu siyasətlər gələcək nəsillər üçün qarmaqarışıqlıq yaradacaq*

**dislodge** [dɪsˈlɔdʒ] *v* **1.** getməyə məcbur etmək; **to ~** ***smb.*** **from a hiding-place** bir kəsi sığınacaqdan çıxıb getməyə məcbur etmək; **to ~ an animal from its lair** heyvanı öz yuvasından qaçırmaq / çıxartmaq; **2.** sıxışdırıb çıxartmaq; kənar etmək, aradan götürmək; tərpətmək; **to ~ a chairman** sədri çıxartmaq; **to ~ a lid** qapağı tərpətmək/yerindən oynatmaq; *There's something between my teeth and I can't dislodge it Dişlərimin arasında nəsə var, onu çıxarda bilmirəm;* **3.** *hərb.* vurub çıxartmaq *(müəyyən mövqedən);* **to ~ the enemy from a hill** düşməni vurub yüksəklikdən çıxartmaq; **4.** vurub salmaq *(həm də id.);* **to ~ the bar** plankanı / tamasanı vurub salmaq; *The wind dislodged some tiles from the roof Külək damdan bir neçə kirəmiti vurub saldı*

**dislodgement** [dɪsˈlɔdʒmənt] *n* kənar etmə /edilmə, vəzifədən götürmə, işdən çıxartma; yerini dəyişdirmə

**disloyal** [dɪsˈlɔɪəl] *adj* **1.** qeyri-loyal, loyal olmayan; **2.** vəfasız, etibarsız; xain, xəyanətkar, əhdi pozan; **a ~ friend** etibarsız / vəfasız dost; **to be ~ to** ***one's*** **country** vətəninə xain çıxmaq/xəyanət etmək; **to be ~ to** ***one's*** **friends** dostlarına etibarsız olmaq

**disloyalty** [dɪsˈlɔɪəltɪ] *n* vəfasızlıq, etibarsızlıq, xəyanətkarlıq; *He has been accused of disloyalty to the party O, partiyaya xəyanətdə müqəssir bilindi*

**dismal** [ˈdɪzməl] *adj* **1.** əzici, sıxıcı, ağır; uğursuz, nəhs, məşum; **~ weather** sıxıntılı/ağır hava; **~ failure** ağır məğlubiyyət; **~ surroundings** əzici/sıxıcı mühit; **2.** qaranlıq; kədərli, qəmgin, dilxor; **~ rooms** qaranlıq otaqlar; **~ face** qəmli / kədərli sifət; **~ mood** dilxor əhval / hal; **a ~ song** kədərli / qəmgin mahnı

**dismally** [ˈdɪzməlɪ] *adv* **1.** tutqun, pərt, qaşqabaqlı; **2.** qəmgin, qüssəli, qəmli-qəmli, qüssəli-qüssəli, məyus-məyus; **to sing ~** qəmli-qəmli oxumaq *(mahnı)*

**dismantle** [dɪsˈmæntl] *v* **1.** sökmək; **to ~ and repair a faulty motor** qüsurlu motoru söküb təmir etmək; **to ~ a roof of the house** evin damını sökmək; **to ~ an exhibition** sərgini sökmək; **2.** son qoymaq, dağıtmaq, ləğv etmək; **to ~ military bases** hərbi bazaları ləğv etmək

**dismantlement** [dɪsˈmæntlmənt] *n* demontaj, sökmə *(maşını, qurğunu),* sökülmə; dağıtma, dağıdılma

**dismay**[1] [dɪsˈmeɪ] *n* çaxnaşma, vəlvələ, həyəcan; təlaş, təşviş, əndişə; qorxu, vahimə, hürkü; **in ~** təlaş / vahimə içərisində; **filled with ~** çaxnaşmaya/vəlvələyə düşmüş

**dismay**[2] [dɪsˈmeɪ] *v* həyəcana/çaxnaşmaya/ vəlvələyə/təşvişə salmaq, narahat etmək, qorxutmaq, qorxuya salmaq; *The news dismayed him Xəbər onu təşvişə saldı*

**dismember** [dɪsˈmembəʳ] *v* **1.** üzvlərinə parçalamaq, üybəüy kəsmək/doğramaq; *The victim's dismembered body was found in a trunk Öldürülmüş adamın üybəüy doğranmış cəsədi çamadandan tapıldı;* **2.** üzvlükdən məhrum etmək; **3.** hissələrə parçalamaq/ayırmaq *(ölkəni)*

**dismemberment** [dɪsˈmembəmənt] *n* **1.** tərkib hissələrinə ayırma, parçalama, parça-parça etmə/doğrama; **2.** üzvlükdən məhrum etmə / çıxartma

**dismiss** [dɪsˈmɪs] *v* **1.** işdən çıxartmaq/azad etmək; **to ~ a servant/an official** qulluqçunu/məmuru işdən azad etmək/çıxartmaq; **2.** *hərb.* buraxmaq, tərxis etmək; **to be ~ed from the army/from service** ordudan buraxılmaq/tərxis olunmaq; **3.** buraxmaq; ləğv etmək; **to ~ the assembly** toplananları buraxmaq; *The teacher dismissed the class 10 minutes early Müəllim sinfi (şagirdləri) 10 dəqiqə tez buraxdı;* **4.** atmaq, rədd etmək; qovmaq, çıxartmaq; **to ~ doubts** şübhələri rədd etmək / qovmaq; **to ~ a matter from** ***one's*** **thoughts** bir şeyi fikrindən qovmaq / çıxartmaq; **5.** imtina etmək; **to ~ the idea** fikirdən/ideyadan imtina etmək; **6.** dayandırmaq, qurtarmaq *(müzakirəni);* nəticə/yekun vurmaq; **to ~ the issue** məsələnin müzakirəsini dayandırmaq/qurtarmaq; **7.** *hüq.* azad etmək, buraxmaq *(həbsdən);* rədd etmək; **to ~ a case** iddianı rədd etmək

**dismissal** [dɪsˈmɪsl] *n* **1.** işdən azad etmə/ çıxartma; **2.** *hərb.* ordudan buraxma/tərxis etmə; **3.** imtina etmə, vaz keçmə; *The hypothesis is worthy of dismissal Bu fərziyyə vaz keçilməyə layiqdir*

**dismissive** [dɪsˈmɪsɪv] *adj* azadlıq verən, azad /xilas edən, xilaskar

**dismount**[1] [dɪsˈmaunt] *n* enmə, endirmə, endirilmə; düşmə, düşürmə

**dismount**[2] [dɪsˈmaunt] *v* **1.** düşmək, enmək; **to ~ from a bicycle** velosipeddən düşmək; **to ~ from a car** maşından düşmək; **to ~ from a train** qatardan düşmək/ enmək; **2.** vurub yəhərdən salmaq; atmaq, tullamaq; *The horse dismounted him At onu yəhərdən saldı / tulladı;* **3.** götürmək, düşürmək; **to ~ a statue from the**

**pedestal** heykəli pyedestaldan düşürmək; **to ~ a gun from the carriage** topu top altlığından düşürmək; 4. sökmək; aralamaq

**disobedience** [.dısə'bi:djəns] *n* itaətsizlik, itaət etməmə, tabe olmama, qulaq asmama

**disobedient** [.dısə'bi:djənt] *adj* 1. sözə baxmayan/qulaq asmayan, itaət etməyən, itaətsiz; tərs, ipə-sapa yatmayan; dikbaş; **a ~ child** sözə baxmayan/ipə-sapa yatmayan uşaq; *He was disobedient to his father O, atasının sözünə baxmırdı / qulaq asmırdı;* 2. inadcıl, inadkar; təsirə düşməyən

**disobediently** [dısə'bı:dıəntlı] *adv* itaətsizcəsinə, dikbaşlıqla, inadkarcasına, inadcıllıqla; **to behave ~** sözə qulaq asmamaq, üzüyola olmamaq

**disobey** ['dısə'beı] *v* 1. qulaq asmamaq, tabe olmamaq; **to ~ *one's* parents** valideynlərinə qulaq asmamaq/tabe olmamaq; **to ~ the order** qaydaya/qayda-qanuna tabe olmamaq; 2. qanunu pozmaq

**disorder**[1] [dıs'ɔ:də'] *n* 1. nizamsızlıq, qarmaqarışıqlıq, qarışıqlıq, qaydasızlıq, səliqəsizlik; dolaşıqlıq; *The papers are in disorder Kağızlar səliqəsiz vəziyyətdədir; My papers are in complete disorder Mənim kağızlarım tamamilə qatmaqarışıqdır; The house was in a state of disorder because of the little children Balaca uşaqların ucbatından otaq səliqəsiz vəziyyətdə idi;* 2. kütləvi iğtişaş, şuluqluq, çaxnaşma, narahatlıq; *The capital is calm, but continuing disorder has been reported elsewhere Paytaxtda sakitlikdir, lakin hər tərəfdə kütləvi iğtişaşın davam etməsi haqqında məlumat verilir;* 3. pozğunluq, xəstəlik; **mental ~** ruhi pozğunluq; **a stomach ~** mədə xəstəliyi / pozulması

**disorder**[2] [dıs'ɔ:də'] *v* 1. qaydasızlıq/qarışıqlıq yaratmaq, qarmaqarışıqlıq salmaq/ törətmək; qarışdırmaq; dolaşdırmaq, nizamsızlıq salmaq; **to ~ documents** sənədləri qarışdırmaq/qarmaqarışıq salmaq; **to ~ *one's* hair** saçını dolaşdırmaq/qarışdırmaq; **to ~ *smb.'s* plan** bir kəsin planını dolaşıq salmaq; 2. korlamaq, xarab etmək *(səhhəti)*; **to ~ the health** sağlamlığı korlamaq

**disordered** [dıs'ɔ:dəd] *adj* 1. qarmaqarışıq /dolaşıq/qarışıq salınmış; 2. xəstə, pozulmuş; **a ~ brain** xəstə beyin

**disorderly**[1] [dıs'ɔ:dəlı] *adj* 1. səliqəsiz, qarışıq, qarmaqarışıq, nizamsız; **a ~ room** səliqəsiz / yığışdırılmamış otaq; **a ~ heap of clothes** bir yığın qarmaqarışıq paltar; **papers to be in a ~ state** qarmaqarışıq vəziyyətdə olan kağızlar; **a ~ demonstration** nizamsız/qarmaqarışıq nümayiş; *Everybody started shouting and the meeting became very disorderly Hamı qışqırmağa başladı və iclasda hərc-mərclik yarandı;* 2. dəliqanlı, qudurğan, dəliqanlılıq / qudurğanlıq / azğınlıq edən; **to charge *smb.* with being drunk and ~** bir kəsi sərxoş olduğuna və qudurğanlıq etdiyinə görə ittiham etmək; *He was arrested for being drunk and disorderly O, sərxoş olduğuna və azğınlıq etdiyinə görə həbs edildi;* 3. *hüq.* qanun-qayda pozan; qeyri-qanuni, qanuna zidd; **~ conduct** xırda xuliqanlıq, ictimai asayişi pozma; **~ person** ictimai qaydanı pozan adam; **~ house** 1) fahişəxana; 2) qumarxana

**disorderly**[2] [dıs'ɔ:dəlı] *adv* 1. nizamsız, pozğun, səliqəsiz, nizamsız/səliqəsiz halda; qeyri-mütəşəkkil *(surətdə);* 2. azğıncasına, qudurğancasına; azğın / qudurmuş halda

**disorganization, -sation** [dıs.ɔ:gənaı'zeıʃn] *n* pozğunluq salma, intizamsızlıq törətmə, işi / intizamı / qaydanı pozma; nizamsızlıq, qarışıqlıq, qaydasızlıq

**disorganize, -ise** [dıs'ɔ:gənaız] *v* pozğunluq salmaq, intizamsızlıq törətmək / salmaq; işi / intizamı / qaydanı pozmaq, qarışıqlıq / nizamsızlıq törətmək

**disorganized, -ised** [dıs'ɔ:gənaızd] *adj* pis təşkil edilmiş / olunmuş; qeyri-mütəşəkkil; **a ~ lesson** pis təşkil edilmiş dərs; *She's so disorganized she never gets anything done O, o qədər qeyri-mütəşəkkildir ki, heç bir işi sona çatdırmır*

**disorganizer, -iser** [dıs'ɔ:gənaızə'] *n* işi pozan, pozğunluq salan, qayda-qanunu / nizam-intizamı pozan adam

**disorientate** [dıs'ɔ:rıenteıt] *v* yanıltmaq, çaşdırmaq, aldatmaq, azdırmaq; *We were disorientated by the maze of streets Küçələrin dolanbacları bizi çaşdırdı*

**disorientated** [dıs'ɔ:rıenteıtıd] *adj* çaşmış, çaşdırılmış, yanılmış, aldadılmış, azdırılmış, yolundan çıxardılmış

**disorientation** [dıs.ɔ:rıen'teıʃn] *n* istiqaməti itirmə, azma, aldanma, çaşma

**disown** [dıs'oun] *v* etiraf etməmək, imtina/ inkar etmək; **to ~ *one's* opinion** öz fikrindən imtina etmək; **to ~ *one's* son/ daughter** öz oğlundan / qızından imtina etmək; *There are times when my children behave so badly I'd happily disown them! Elə vaxtlar olur ki, uşaqlarım elə pis hərəkət edirlər ki, mən məmnuniyyətlə onlardan imtina edərdim*

**disparage** [dıs'pærıdʒ] *v* 1. qiymət verməmək, lazımi qədər qiymətləndirməmək; azaltmaq, əskiltmək; hörmətdən/qiymətdən salmaq; **to ~ *smb.'s* achievements** bir kəsin nailiyyətlərini lazımi dərəcədə qiymətləndirməmək; 2. pisləmək, ləkələmək; 3. alçaltmaq, hörmətdən salmaq, təhqir etmək, şübhə altına almaq

**disparagement** [dıs'pærıdʒmənt] *n* 1. saymama; etinasızlıq, saygısızlıq, laqeydlik; saygısızlıq göstərmə, məhəl qoymama; qiymət verməmə, lazımi qədər qiymətləndirməmə; 2. ləyaqəti alçaltma /hörmətdən/ nüfuzdan salma; həqarət, təhqir

**disparaging** [dıs'pærıdʒıŋ] *adj* etinasız, saygısız, saymaz, laqeyd; **~ remarks** etinasız / saygısız / laqeyd iradlar



**disparagingly** [dıs'pærıdʒıŋlı] *adv* etinasızlıqla, saymazlıqla, saygısızlıqla, saymazcasına, saymazyana; **to speak ~ of *smb.*** bir kəsin haqqında etinasızlıqla / saymazyana danışmaq

**disparate** ['dıspərıt] *adj* müqayisəedilməz; bir ölçüyə gəlməyən, tutuşdurula bilməyən, müqayisə edilə bilməyən; *Chalk and cheese are disparate Təbaşirlə pendir müqayisəedilməzdir*

**disparity** [dıs'pærıtı] *n* fərq, uyğunsuzluq, bərabər olmama, tənasübsüzlük, uyğunsuzluq, bir ölçüdə olmama; **~ in position** vəziyyətdə fərq /uyğunsuzluq; *There is a big disparity in their ages Onların yaşında çox böyük fərq/uyğunsuzluq var*

**dispart** [dıs'pa:t] *v* bölmək, ayırmaq; parçalamaq; bölünmək, ayrılmaq, parçalanmaq

**dispassion** [dıs'pæʃn] *n* ehtirassızlıq, soyuqluq, həvəssizlik, şövqsüzlük

**dispassionate** [dıs'pæʃnıt] *adj* 1. ehtirassız, həvəssiz, şövqsüz, soyuq, soyuqqanlı, sakit, dinc; **a ~ observer** soyuqqanlı / sakit müşahidəçi; 2. qərəzsiz, tərəfkeşlik etməyən, bitərəf; **~ view** soyuq nəzər

**dispassionately** [dıs'pæʃnıtlı] *adv* 1. həvəssiz, şövqsüz olaraq, soyuq bir surətdə / tərzdə, soyuqqanlılıqla, təmkinlə; 2. qərəzsiz *(olaraq)*, üzgörmədən, insafla; *He listened dispassionately to both arguments O, soyuqqanlılıqla hər iki arqumentə qulaq asdı*

**dispatch**[1] [dıs'pætʃ] *n* 1. göndərmə, yola salma, yollama; **~ of a letter / a telegram** məktub/teleqram göndərmə; *The government welcomed the dispatch of the peacekeeping force Hökumət sülh yaradan qüvvənin göndərilməsini razılıqla qarşıladı;* 2. rəsmi məlumat/xəbər; **diplomatic ~es** diplomatik yazışma, korrespondensiya; 3. cəldlik, sürət; **to do *smth.* with ~** bir şeyi cəld/sürətlə etmək; 4. həll etmə, qaydaya/nizama salma, tənzim etmə/edilmə; **quick ~** cəld / tez həll etmə; **prompt ~ of affairs** işləri süründürməçiliyə salmadan həll etmə; 5. kuryer; **to send *smth.* by ~** bir şeyi kuryer vasitəsilə göndərmək; 6. edam, ölüm cəzası; öldürmə, öldürülmə

**dispatch**[2] [dıs'pætʃ] *v* 1. göndərmək, yola salmaq, yollamaq; **to ~ troops** qoşun göndərmək; **to ~ a letter** məktub göndərmək /yollamaq; *American warships have been dispatched to the area Ərazıyə amerikan hərbi gəmiləri göndərilib;* 2. öldürmək, qətlə yetirmək; **to ~ a wounded animal** yaralı heyvanı öldürmək

**dispatch-bearer** [dıs'pætʃ.bɛərə'] *n* diplomatik kuryer

**dispatcher** [dıs'pætʃə'] *n* 1. göndərən *(adam)*; 2. dispetçer *(nəqliyyatın hərəkətini, müəssisə və ya idarənin işlərini müxtəlif əlaqə vasitələri ilə nizama salan işçi);* 3. ekspeditor *(mal və s. göndərməklə məşğul olan işçi)*

**dispatch-rider** [dıs'pætʃ.raıdə'] *n* *motosikletlə məktub paylayan poçt işçisi*

**dispel** [dıs'pel] *v* 1. qovmaq, dağıtmaq; yox etmək; **to ~ the darkness** qaranlığı dağıtmaq/qovmaq; **to ~ *smb.'s* doubts** bir kəsin şübhələrini dağıtmaq/yox etmək; **to ~ clouds** buludları dağıtmaq; **to ~ sorrow** dərdi/kədəri dağıtmaq; *The wind dispelled the clouds Külək buludları dağıtdı; His calm words dispelled our doubts Onun inamlı sözləri bizim şübhələrimizi yox etdi;* 2. dağıdılmaq, qovulmaq, yox olmaq

**dispensable** [dıs'pensəbl] *adj* 1. məcburi / vacib olmayan, əhəmiyyətsiz, əhəmiyyəti az olan, ikinci dərəcəli; 2. yol verilən / verilə bilən, mümkün olan; güman edilə bilən, bağışlanıla bilən, bağışlanası, keçiləsi

**dispensary** [dıs'pensərı] *n* 1. dispanser *(xəstəliklərin qabağını alan və müalicə edən tibbi müəssisə);* 2. kasıblara pulsuz dərman verən aptek / əczaxana

**dispensation** [.dıspen'seıʃn] *n* 1. bölmə, bölüşdürmə, bölünmə, təqsim etmə/edilmə; paylama, paylanma, paylaşdırma; bölgü; **~ of pensions** təqaüdün paylanması; **~ of food** yeməyin paylanması / verilməsi; 2. idarə etmə; yerinə yetirmə *(rəhbərliyi və s.);* 3. azad etmə, qurtulma; qurtuluş; azad/xilas etmə; 4. ehtiyat, ehtiyatlılıq, tədbirlilik; 5. məsuliyyətdən azad etmə; qaydadan kənara çıxmağa icazə vermə / verilmə; 6. icazə, rüsxət; *She needs a special dispensation to marry to her cousin Onun əmisi oğluna ərə getməsi üçün xüsusi icazə lazımdır;* 7. *din.* ehkam; qanun; **Christian ~s** xristian ehkamları / qanunları

**dispense** [dıs'pens] *v* 1. bölüşdürmək, bölmək, paylamaq; təsnif etmək; vermək; **to ~ bounties** qiymətli hədiyyələr vermək; **to ~ money** pul vermək / bağışlamaq; *On Saturday morning my father solemnly dispensed pocket money to each of the children Şənbə günü səhər atam şəstlə uşaqların hər birinə cibxərcliyi verdi;* 2. yazmaq, vermək *(dərman)*; 3. hazırlamaq və buraxmaq *(dərman)*; **~ from** azad etmək *(məsuliyyətdən, vəddən, əhd-peymandan)*; **to ~ from duty** vəzifəni icra etməkdən / vəzifədən azad etmək; **to ~ *smb.* from fasting** bir kəsi oruc tutmaqdan azad etmək; **to ~ with** keçinmək; **to ~ with *smb.'s* help** bir kəsin köməyi olmadan keçinmək; *These men could be dispensed with Bu adamlarsız keçinmək olardı;* **to ~ with the necessity of doing *smth.*** bir şeyi etmək zərurətindən azad etmək

**dispenser** [dıs'pensə'] *n* 1. əczaçı; 2. ticarət avtomatı

**disperse** [dıs'pə:s] *v* 1. dağıtmaq; qovmaq; **to ~ a crowd** izdihamı / camaatı dağıtmaq; **to ~ clouds** buludları dağıtmaq / qovmaq; *The wind dispersed the clouds Külək buludları dağıt-*

*dı/qovdu;* **to ~ *smb.'s* doubts** bir kəsin şübhələrini dağıtmaq; 2. dağılmaq, dağılışmaq, dağılışıb getmək; *The crowd dispersed İzdiham dağıldı / dağılışdı;* 3. səpələmək; yerləşdirmək; *The fugitives were dispersed about the country Qaçqınlar ölkənin hər tərəfinə səpələndi;* **to ~ sentinels in various places** müxtəlif yerlərə qarovulçular qoymaq; 4. yaymaq; **to ~ newspapers/ books** qəzet/kitab yaymaq; 5. məhv/yox etmək, yox olmaq, çəkilmək *(şiş haq.);* **to ~ a tumour** şişi çəkilmək

**dispersal** [dıs'pə:sl] *n* dağılma, dağılışma, səpələnmə; **crowd ~** izdihamın/camaatın dağılması / dağılışması

**dispersion** [dıs'pə:ʃn] *n* **1.** dağılma, səpələnmə; **the ~ of light** işığın dağılması/səpələnməsi; **2. population ~** əhalinin səpələnməsi; 2. çəkilmə, sorulma *(şiş haq.);* 3. *kim. fiz.* diffuziya *(molekulyar hərəkət nəticəsində maddələrin tədricən qarışması);* 4. *fiz.* dispersiyaya ayrılma, səpilmə, parçalanma

**dispirit** [dı'spırıt] *v* kədərləndirmək, məyus/dilxor/pərt etmək; darıxdırmaq; cəsarətsizləşdirmək

**dispirited** [dı'spırıtıd] *adj* **1.** dilxor / pərt olmuş; qəmgin, kədərli, pərt, dilxor, məyus; mütəəssir, sarsılmış; hüznlü, həzin; **a ~ air** dilxor / qəmgin / məyus / hüznlü görkəm; 2. cansız, sönük, ölgün; **~ expressions** cansız / sönük ifadələr

**dispiritedly** [dı'spırıtıdlı] *adv* darıxdırıcı bir tərzdə/surətdə, dilxor olmuş halda, pərt, qəmgin-qəmgin, dilxor-dilxor, kədərli/məyus halda, məyus-məyus, həzin-həzin

**displace** [dıs'pleıs] *v* **1.** yerini dəyişdirmək, başqa yerə qoymaq; 2. çıxartmaq *(vəzifədən);* **to ~ an officer** zabiti vəzifədən çıxartmaq; 3. sıxışdırıb aradan çıxartmaq; *Moderates have displaced the extremists on the committee Komitədə mötədillər ekstremistləri sıxışdırıb aradan çıxartdılar; Weeds displaced all other plants Alaq otları bütün bitkiləri sıxışdırıb aradan çıxartdı*

**displacement** [dıs'pleısmənt] *n* **1.** yerdəyişmə, yeri dəyişdirmə; bir yerdən başqa yerə keçmə; 2. *tib.* çıxma, çıxıq; 3. əvəz etmə, dəyişdirmə, əvəz edilmə/olunma; **~ of human labour by machinery** əl əməyinin maşınla əvəz edilməsi *(sənayedə);* 4. çıxartma, kənarlaşdırma *(vəzifədən);* 5. sıxışdırıb aradan çıxarma; 6. *dən.* su basımı, tonnaj; **a vessel with a ~ of 10. 000 tons** 10.000 ton su basımı olan gəmi

**display**[1] [dıs'pleı] *n* **1.** göstərmə, göstərilmə; nümayiş etdirmə; **~ of military strength** hərbi güc nümayiş etdirmə; **a ~ of courage** igidlik/cəsarət nümayiş etdirmə; *They put the documents on display in the hall Onlar sənədləri zalda nümayiş etdirdilər;* **fashion ~** moda nümayişi; **~ of pictures/goods** şəkillərin/malların sərgisi; **2.** büruzə vermə, nümayiş etdirmə; **~ of loyalty** loyallıq göstərmə / nümayiş etdirmə; **to give a ~ of courage** cəsarət nümayiş etdirmək / göstərmək; 3. özünü gözə soxma, lovğalanma; **to make a ~ of wit** öz ağlı ilə lovğalanmaq; **to make a ~ of *one's* knowledge** öz biliyi ilə öyünmək; *He's fond of display O özünü gözə soxmağı xoşlayır*

**display**[2] [dıs'pleı] *v* **1.** göstərmək, nümayiş etdirmək; **to ~ the national flag** milli bayrağı asmaq; **to ~ goods in a shop-window** malları mağaza vitrinində nümayiş etdirmək; **to ~ *one's* bravery** qocalığını / igidliyini nümayiş etdirmək; 2. büruzə vermək, göstərmək; **to ~ *one's* ignorance** öz nadanlığını büruzə vermək /göstərmək; 3. lovğalanmaq, öyünmək

**displease** [dıs'pli:z] *v* xoşuna gəlməmək, xoşlamamaq, zövqünə uyğun olmamaq; *The painter's colouring displeases me Bu rəssamın boyaları mənim xoşuma gəlmir;* **to be ~d to have/to do *smth.*** bir şeyi həvəssiz etmək; **to be ~d with / at *smth.*** bir şeydən razı olmamaq/xoşu gəlməmək; *I'm displeased with myself Mən özümdən razı deyiləm*

**displeased** [dıs'pli:zd] *adj* narazı, razı olmayan; **to be ~d with *smb.*** bir kəsdən narazı olmaq; *I was most displeased with the children for waking me in the middle of the night Gecənin yarısı məni yuxudan oyatdıqları üçün mən uşaqlardan çox narazı idim*

**displeasing** [dıs'pli:zıŋ] *adj* **1.** pis, nifrət oyadan, xoşagəlməz, iyrənc, çirkin; 2. əsəbiləşdirici, əsəbiləşdirən; qıcıqlandırıcı, narazılıq / ədavət doğuran

**displeasure** [dıs'pleʒəʳ] *n* narazılıq, məmnuniyyətsizlik; **to incur *smb.'s* ~** bir kəsdə narazılıq yaratmaq

**disposable** [dıs'pouzəbl] *adj* **1.** birdəfəlik, atılmalı *(istifadə edildikdən sonra);* **~ paper plates** birdəfəlik kağız boşqablar; **~ razors** birdəfəlik ülgüclər; 2. sərbəst, azad, istifadə edilə/oluna bilən; **~ income** təmiz gəlir *(vergi verdikdən sonra qalan)*

**disposal** [dıs'pouzəl] *n* **1.** vermə; **~ of property** əmlakı vermə; 2. uzaqlaşma, yaxa qurtarma *(bir şeydən);* **~ of the dead** cənazəni dəfn etmə; **~ of bombs** *hərb.* bombaları zərərsizləşdirmə; 3. əmr/sərəncam / göstəriş vermə ixtiyarı; **to have entire ~ of an estate** əmlak üzərində tam ixtiyarı olmaq; **at / in *smb.'s* ~** bir kəsin ixtiyarında; **to place/to leave *smth.* at *smb.'s* ~** bir şeyi bir kəsin ixtiyarına vermək/buraxmaq; 4. idarə, nəzarət; **~ of business affairs** işləri idarə etmə, işlərə nəzarət etmə; 5. qoyma, yerləşdirmə, yerbəyer etmə, düzülmə; **~ of furniture** mebeli yerləşdirmə; **~ of troops** qoşunların tutduğu mövqe; 6. qaydaya salma, yoluna qoyma; **~ of a question** məsələni yoluna qoyma / qaydaya salma; 7. ixtiyarında olma; *The*



*students have a rich library at their disposal Tələbələrin ixtiyarında zəngin kitabxana var*

**dispose** [dıs'pouz] *v* **1.** yerləşdirmək, yerbəyer etmək, düzmək, sahmanlamaq; **to ~ troops** qoşunu yerləşdirmək; *Various objects were disposed on the desk in front of her Onun qarşısında stolun üstündə müxtəlif əşyalar düzülmüşdü;* **2.** qaydaya salmaq; yoluna qoymaq, həll etmək; **3.** təsir altına salmaq, meyllendirmək, təhrik etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir şeyi etməyə meyllendirmək/təhrik etmək; *I'm disposed to help you Mən sənə / sizə kömək etməyə hazıram; He's well disposed towards me Onun mənə münasibəti yaxşıdır;* **to ~ of 1)** yığmaq, yığışdırmaq; **to ~ rubbish** zibili yığmaq/yığışdırmaq; **2)** qurtarmaq *(yeməyi, içməyi);* **to ~ of food** yeməyi qurtarmaq; 3) hesablaşmaq; **to ~ of *one's* enemy** düşməni ilə hesablaşmaq; 4) qurtarmaq, bitirmək; **to ~ of a piece of business** işi qurtarmaq/ bitirmək; 5) istifadə etmək; **to ~ of *one's* time** vaxtından istifadə etmək; 6) vermək, bəxş etmək; satmaq; **to ~ of property** əmlaka sahib olmaq *(almaq, bəxşiş yolu ilə);* **to ~ of goods** mal satmaq;

◊ *Man proposes (but) God disposes ≅ Sən saydığını say, gör Fələk nə sayır*

**disposed** [dıs'pouzd] *adj* **1.** yerləşdirilmiş, düzülmüş, qoyulmuş, yerbəyer edilmiş; **2.** meylli, əhval-ruhiyyəsi qaldırılmış; *I'm disposed for a walk Mən gəzməyin əleyhinə deyiləm; I don't feel disposed to help you Mənim sənə/sizə kömək etməyə meylim yoxdur*

**disposer** [dıs'pouzəʳ] *n* **1.** idarə edən, dolandıran, rəhbərlik edən; müdir, idarə başçısı, təsərrüfat müdiri; **2.** sərəncamçı, sərəncam verən, başçılıq edən

**disposition** [.dıspə'zıʃn] *n* **1.** xarakter, təbiət *(xasiyyət, iradə, inad);* **to be of a cruel ~** qəddar xaraktere malik olmaq; **to have a domineering ~** amiranə xaraktere malik olmaq; **2.** meylli olma; **~ to jealousy** qısqanclığa meylli; *She has a disposition to this disease O bu xəstəliyə meyllidir;* **to show a ~ to do *smth.*** bir şeyi etməyə meylli olmağı nümayiş etdirmək; **3.** yerləşmə, yerləşdirmə; düzülüş, sahman; yerbəyer etmə/edilmə; **~ of rooms** otaqların yerləşməsi; **~ of enemy forces** düşmən ordusunun yerləşməsi/yerləşdirilməsi; **4.** nəzarət, idarə; sərəncam vermə hüququ; **at/in *smb.'s* ~** bir kəsin ixtiyarında/sərəncamında; *He has the disposition of the land Torpaq onun ixtiyarındadır;* **5. (of)** vermə *(bir kəsə);* ləğv etmə; **the ~ of surplus goods** mal artıqlarını ləğv etmək; **the ~ of garbage** zibili daşıma; **6.** *hüq.* sərəncam, əmr, qərar, qətnamə; **the ~s of the statute** qanun əsasnaməsi; **7.** plan; hazırlıq; **~s for a journey** səyahətə hazırlıq

**dispossess** ['dıspə'zes] *v hüq.* əmlakdan məhrum etmək, əmlak hüququnu əlindən almaq; **to ~ *smb.* of his land** bir kəsin torpağını əlindən almaq; *They dispossessed me of my house Onlar evimi əlimdən aldılar; The nobles were dispossessed of their estates after the revolution İnqilabdan sonra zadəganların mülkü əllərindən alındı*

**dispossession** [.dıspə'zeʃn] *n* **1.** malik olma hüququndan məhrum etmə *(əmlak, var, var-dövlət haq.);* **2.** qeyri-qanuni sahib olma

**dispraise**[1] [dıs'preız] *n* məzəmmət, töhmət; bəyənməmə, pisləmə; danlaq, tənə, qınama; **to speak in ~ of *smb.*** bir kəs haqqında pis danışmaq

**dispraise**[2] [dıs'preız] *v* pisləmək, məzəmmətləmək, töhmətləndirmək, qınamaq, bəyənməmək, danlamaq, tənə vurmaq

**dispread** [dıs'pred] *v arx.* **1.** yaymaq, intişar etdirmək; **2.** yayılmaq; genişlənmək, intişar tapmaq

**disprison** [dıs'prızn] *v* həbsdən / dustaqxanadan azad etmək

**disproof** ['dıs'pru:f] *n* təkzib, təkzib etmə / edilmə, yalana çıxartma

**disproportion**[1] ['dısprə'pɔ:ʃn] *n* disproporsiya, nisbətsizlik, tənasübsüzlük, uyğunsuzluq, biçimsizlik; qeyri-proporsionallıq; **~ in age** yaşda disproporsiya/ uyğunsuzluq; *There's disproportion in their age Onların yaşında uyğunsuzluq/fərq var*

**disproportion**[2] [.dısprə'pɔ:ʃn] *v* tənasübluyü/nisbəti/ mütənasibliyi pozmaq

**disproportional** [.dısprə'pɔ:ʃənl] *adj* = **disproportionate**

**disproportionate** [.dısprə'pɔ:ʃnıt] *adj* **(to)** qeyri-proporsional, uyğun olmayan / gəlməyən

**disproportionately** [.dısprə'pɔ:ʃnıtlı] *adv* qeyri-uyğun bir şəkildə, qeyri-proporsional olaraq, uyğun olmayaraq; *Babies often seem to have disproportionately large heads Tez-tez uşaqların anormal iri başı olur*

**disprove** [.dıs'pru:v] *v* təkzib etmək; yalan olduğunu sübuta yetirmək, yalana çıxartmaq; *The allegations have been completely disproved Boş iddialar tamamilə təkzib edilib*

**disputable** [dı'spju:təbl] *adj* mübahisəli; sübut edilməmiş / olunmamış, şübhəli; **a ~ question** mübahisəli məsələ; **a ~ claim** mübahisəli iddia

**disputation** [.dıspju'teıʃn] *n* mübahisə; müzakirə, disput; **to hold a ~** disput keçirmək

**disputatious** [.dıspju'teıʃəs] *adj* mübahisə etməyi sevən/xoşlayan; tərs, inad, yolagəlməz

**dispute**[1] [dıs'pju:t] *n* **1.** disput; diskussiya, mübahisə, müzakirə; **heated ~** qızğın mübahisə/müzakirə; **bitter ~** kəskin mübahisə; **2.** çəkişmə, münaqişə, davalı/mübahisəli iş; **border ~** sərhəd münaqişəsi; **a border ~ that can easily become a war** asanlıqla müharibəyə çevrilə bilən sərhəd münaqişəsi; **international ~** beynəlxalq münaqişə / çəkişmə; **matter in ~** münaqişəli / mübahisəli məsələ; **beyond /out of/without ~** şübhəsiz, heç bir şübhə doğurmayan; *Her courage is beyond dispute Onun cəsarəti şübhəsizdir/şəksizdir*

**dispute²** [dɪs'pju:t] *v* 1. müzakirə etmək, diskussiya aparmaq, müzakirədə iştirak etmək; **to ~ a decision** qərarı müzakirə etmək; **to ~ a question** 1) məsələ müzakirə etmək; 2) mübahisə etmək; *It was no use disputing with him Onunla mübahisə etməyin mənası yox idi;* **to ~ about / on / upon** ***smth.*** bir şey haqqında mübahisə etmək; 2. şübhələnmək, şübhə altına almaq; razı olmamaq, qəbul etməmək, höcət etmək; **to ~ a statement / a fact** məlumatı / faktı şübhə altına almaq; **to ~ an election** seçkinin nəticəsinə şübhə ilə yanaşmaq; 3. əleyhinə çıxmaq, əldə silah müqavimət göstərmək; **to ~ the enemy's advance** düşmən hücumuna müqavimət göstərmək; 4. uğrunda mübarizə aparmaq; əldə etmək, nail olmaq; **to ~ a victory/a prize** qələbə/ priz əldə etmək; **to ~ in arms every inch of ground** əldə silah torpağın hər qarışını müdafiə etmək

**disqualification** [dɪs͵kwɔlɪfɪ'keɪʃn] *n* hüququnu alma, hüquqdan məhrum etmə; ixtisasdan məhrum etmə, idman yarışlarında iştirakdan kənarlaşdırma / kənarlaşdırılma, diskvalifikasiya etmə/edilmə; **~ for driving while drunk** sərxoş halda maşın sürdüyünə görə sürücülük hüququndan məhrum etmə

**disqualify** [dɪs'kwɔlɪfaɪ] *v (pt, pp* **-fied)** hüququnu almaq, hüququndan məhrum etmək, ixtisasdan məhrum etmək, diskvalifikasiya etmək; **to ~ *smb.* for the Olympic games** bir kəsi Olimpiya oyunlarında iştirak etmək hüququndan məhrum etmək; *The judge disqualified him from driving for six months Hakim onu altı ay maşın sürmək hüququndan məhrum etdi; The players were disqualified for cheating Oyunçular kələk işlətdikləri üçün oyundan diskvalifikasiya edildilər*

**disquiet¹** [dɪs'kwaɪət] *n* narahatlıq, təlaş, nigarançılıq, təşviş; həyəcan; **public ~** ictimai narahatlıq / təşviş

**disquiet²** [dɪs'kwaɪət] *adj* narahat, təlaşlı, həyəcanlı, iztirablı, aramsız; nadinc, səksəkəli, rahatlığını itirmiş

**disquiet³** [dɪs'kwaɪət] *v* narahat etmək, incitmək, əziyyət vermək; təşvişə salmaq, nigaran etmək, rahatlığını itirmək; *His mother is disquieted because she has received no letters from him for 4 months Anası ondan narahatdır, çünki 4 aydır ki, ondan heç bir məktub almayıb*

**disquieting** [dɪs'kwaɪətɪŋ] *adj* narahatlıq/nigarançılıq / təlaş / təşviş doğuran; **~ news** narahatlıq/nigarançılıq/təlaş doğuran xəbərlər

**disquietude** [͵dɪs'kwaɪɪtju:d] *n* narahatlıq, təlaş, nigaranlıq, təşviş

**disquisition** [͵dɪskwɪ'zɪʃn] *n* 1. ətraflı / hərtərəfli müzakirə; 2. tədqiqat, araşdırma

**disregard¹** ['dɪsrɪ'ga:d] *n* 1. diqqətsizlik, əhəmiyyət verməmə; 2. hörmətsizlik, etinasızlıq, saymazlıq

**disregard²** ['dɪsrɪ'ga:d] *v* 1. diqqət verməmək/yetirməmək, əhəmiyyət verməmək, etinasızlıq/laqeydlik göstərmək; **to ~ orders** əmri yerinə yetirməkdən boyun qaçırmaq; 2. hörmət etməmək/göstərməmək, etina etməmək, saymamaq, məhəl qoymamaq, laqeydlik göstərmək; **to ~ *one's* friends** dostlarına məhəl qoymamaq/laqeydlik göstərmək; **to ~ a warning** xəbərdarlığa məhəl qoymamaq/etina etməmək

**disrepair** [͵dɪsrɪ'peəʳ] *n* köhnəlik, nasaz / pis vəziyyətdə olma; **to be in a state of ~** nasaz vəziyyətdə olmaq; *The building was in disrepair Bina dağılmış vəziyyətdə idi; The building had fallen into disrepair Bina pis vəziyyətə düşmüşdü*

**disreputable** [dɪs'repjutəbl] *adj* biabırçı, rüsvayçı, eyibli, utanmalı, utanılacaq, əttökən; biabır / rüsvay edən; **~ act** biabırçı hərəkət; **a ~ appearance** biabırçı/rüsvayçı görkəm; **~ people** rüsvay edən/biabırçı adamlar; *He has been accused of using disreputable business methods O, rüsvayçı iş metodlarından / üsullarından istifadə etməkdə ittiham edilib*

**disreputably** [dɪs'repjutəblɪ] *adv* biabırçılıqla, rüsvayçılıqla, biabırcasına; gülünc; **to behave ~** biabırcasına hərəkət etmək, gülünc davranmaq

**disrepute** [͵dɪsrɪ'pju:t] *n* pis ad/şöhrət, şübhəli ad/şöhrət; **to fall into ~** pis ad qazanmaq; **to bring *smb./smth.* into ~** bir kəsə / şeyə pis ad qazandırmaq; *As a result of their behaviour in the match both teams have been charged with bringing the game into disrepute Yarışdakı hərəkətlərinə görə hər iki komanda ittiham olunub*

**disrespect** [͵dɪsrɪs'pekt] *n* hörmətsizlik, ehtiramsızlıq, saymazlıq, saymama; **to treat *smb.* with ~** bir kəsə qarşı hörmətsizlik etmək/etinasızlıq göstərmək

**disrespectful** [͵dɪsrɪs'pektfl] *adj* hörmətsiz, saygısız; hörmət etməyən / gözləməyən, ehtiramsız, tərbiyəsiz; qaba, kobud; ötkəm; **in a ~ manner** hörmətsiz / saygısız bir tərzdə; **~ remark** kobud / qaba irad

**disrespectfully** [͵dɪsrɪs'pektfulɪ] *adv* hörmətsizliklə, saymazyana, ehtiramsızlıqla; ədəbsizliklə, nəzakətsiz bir tərzdə / qaydada; qaba / kobud bir tərzdə

**disrespectfulness** [͵dɪsrɪs'pektfulnɪs] *n* ədəbsizlik, saygısızlıq, nəzakətsizlik, ehtiramsızlıq, kobudluq, qabalıq, tərbiyəsizlik; saymazlıq

**disrobe** [dɪs'roub] *v* 1. soyundurmaq, paltarını çıxartmaq; 2. ifşa etmək

**disroot** ['dɪs'ru:t] *v* kökündən çıxartmaq; kökünü kəsmək

**disrupt** [dɪs'rʌpt] *v* pozmaq, korlamaq; parçalamaq; müvəffəqiyyətsizliyə uğratmaq; qırmaq *(əlaqəni);* **to ~ a meeting** iclası pozmaq; **to ~ a trade union** həmkarlar ittifaqını dağıtmaq / parçalamaq; *Fog has seriously disrupted traffic Duman küçə hərəkətini ciddi surətdə pozdu*

**disruption** [dɪs'rʌpʃn] *n* 1. pozma, korlama, pozulma, korlanma; qırma, qırılma; 2. iflas, dağılma, yıxılma, süqut etmə; **~ of an empire** imperiyanın dağılması / iflası / süqut etməsi; 3. ayrılma, parçalanma; 4. xarabalıq, viranəlik, xarabazarlıq, xaraba; 5. *fiz.* parçalanma

**disruptive** [dɪs'rʌptɪv] *adj* pozucu, dağıdıcı; ziyankar; ziyankarlıq, pozuculuq; **~ behaviour** pozucu/dağıdıcı rəftar; *A few disruptive students can easily ruin a class Bir neçə pozucu tələbə qrupu asanlıqla dağıda bilər*

**dissatisfaction** ['dɪs͵sætɪs'fækʃn] *n* təmin olunmama, arzusu yerinə yetməmə; narazılıq; **grave/serious ~** ciddi narazılıq; **to express *one's* ~ at / with / over *smth.*** bir şeylə əlaqədar olaraq narazılığını bildirmək

**dissatisfied** ['dɪs'sætɪsfaɪd] *adj* təmin olunmamış, arzusuna çatmamış, narazı; narazılıq ifadə edən/bildirən; **~ with/at *smth.*** bir şeydən narazı; **a ~ customer** narazı müştəri; *I'm thoroughly dissatisfied with your work Mən sənin / sizin işindən / işinizdən qətiyyən razı deyiləm*

**dissatisfy** [dɪs'sætɪsfaɪ] *v* təmin etməmək, narazı salmaq / etmək

**disseat** [dɪs'si:t] *v* 1. devirmək *(hökmdarı);* 2. geri çağırmaq *(deputatı);* 3. çıxartmaq, azad etmək *(vəzifədən)*

**dissect** [dɪ'sekt] *v* 1. yarmaq, kəsmək; **to ~ a body** meyiti yarmaq; 2. təhlil etmək, hərtərəfli tədqiq etmək; **to ~ a theory** nəzəriyyəni təhlil etmək; *Commentators are still dissecting the election results Şərhçilər hələ də seçkinin nəticələrini təhlil edirlər*

**dissected** [dɪ'sektɪd] *adj* 1. kəsilmiş, yarılmış; 2. kəsikli, yarıqlı; kəsik, yarıq; **~ map** kəsik xəritə, ayrı-ayrı hissələrdən ibarət olan xəritə; 3. kəsilmiş, doğranmış; kəsik-kəsik / doğram-doğram edilmiş; 4. *bot.* çapıq; **~ leaf** çapıq yarpaq

**dissection** [dɪ'sekʃn] *n* 1. yarma; **anatomical ~** anatomik yarma; 2. təhlil, təhlil etmə, tədqiqat, tənqidi təhlil

**dissemble** [dɪ'sembl] *v* 1. gizlətmək, gizləmək; gizli saxlamaq; bildirməmək; ört-basdır etmək, pərdələmək; **to ~ *one's* feelings** öz hisslərini gizlətmək; **to ~ *one's* knowledge of *smth.*** bir şey haqqında bildiklərini gizli saxlamaq; 2. saymamaq, nəzərə almamaq, əhəmiyyət verməmək, məhəl qoymamaq, diqqət yetirməmək; *məc.* göz yummaq; **to ~ an insult** təhqirə əhəmiyyət verməmək/məhəl qoymamaq; 3. yalandan özünü ...göstərmək, ...qoymaq, riyakarlıq etmək, ...kimi göstərmək

**disseminate** [dɪ'semɪneɪt] *v* 1. səpmək, *(toxumu);* 2. yaymaq, intişar etdirmək *(fikri, inamı və s.); The mass media are used to disseminate information Kütləvi informasiya vasitələri məlumat yaymaq üçün istifadə edilir;* **to ~ knowledge** bilik yaymaq

**dissemination** [dɪ͵semɪ'neɪʃn] *n* 1. səpmə, səpələmə, səpələnmə; 2. *bot.* səpmə *(toxumu);* 3. yayma; **the ~ of knowledge** bilikləri yayma; **the ~ of false information** yalan məlumat yayma; **~ of nuclear weapons** nüvə silahlarının yayılması

**dissension** [dɪ'senʃn] *n* 1. fikir ayrılığı; ziddiyyət; narazılıq; **~ among government ministers** hökumət nazirləri arasında fikir ayrılığı; 2. çəkişmə, nifaq, ədavət, ixtilaf, düşmənçilik

**dissent¹** [dɪ'sent] *n* fikir ayrılığı, nifaq, ixtilaf; **~ from an opinion** bir fikirlə razılaşmama; **to express strong ~** qəti olaraq etiraz etmək

**dissent²** [dɪ'sent] *v* razılaşmamaq, etiraz etmək; **to ~ *smb.'s* opinion** bir kəsin fikrinə/rəyinə etiraz etmək; *The committee dissented from the report's conclusions Komitə hesabatın nəticələrinə etiraz etdi*

**dissenter** [dɪ'sentəʳ] *n* təfriqəçi, təfriqə / nifaq / ikitirəlik / ayrılıq salan

**dissertation** [͵dɪsə'teɪʃn] *n* 1. dissertasiya; **~ on mathematics/on history/on botany** *etc.* riyaziyyat / tarix / botanika və s. üzrə dissertasiya; **~ for the degree of Phylosophy Doctor** fəlsəfə üzrə elmlər doktoru dərəcəsi almaq üçün dissertasiya; **my doctoral ~ in English dialects** mənim ingilis dialektləri haqqında doktorluq dissertasiyam; 2. elmi əsər, tədqiqat; mübahisə

**dissertator** ['dɪsə:teɪtəʳ] *n* dissertasiya müəllifi; dissertant

**disserve** ['dɪs'sə:v] *v* pis xidmət göstərmək; ziyan verməyə / gətirməyə səbəb olmaq, ziyan / zərər vermək

**disservice** ['dɪs'sə:vɪs] *n* pis xidmət, zərər / ziyan vermə; zərər, ziyan; **to do a ~ to *smb.*** bir kəsə zərər/ziyan vurmaq; *She did her cause a great disservice by concealing the truth Həqiqəti gizlətməklə o, işinə çox böyük ziyan vurdu*

**dissever** [dɪs'sevəʳ] *v* 1. ayırmaq, aralamaq; **to ~ a phrase from the context** ifadəni mətndən ayırmaq; 2. hissələrinə bölmək / ayırmaq

**dissidence** ['dɪsɪdns] *n* razı olmama, razılaşmama, ixtilaf; narazılıq, müxtəlif fikirdə olma

**dissident** ['dɪsɪdənt] *n* 1. dissident *(başqa cür düşünən/hakim rejimlə razılaşmayan adam);* 2. *tar.* mürtəd *(hakim dindən ayrılmış şəxs)*

**dissimilar** ['dɪ'sɪmɪləʳ] *adj* oxşamayan, bənzəməyən, oxşarı/bənzəri olmayan; fərqli, müxtəlif; **~ tastes** müxtəlif zövqlər; **a picture ~ to/with the others** başqalarına oxşamayan /bənzəməyən şəkil; *These wines are dissimilar Bu şərablar bir-birinə oxşamır*

**dissimilarity** [͵dɪsɪmɪ'lærɪtɪ] *n* bənzərsizlik, bənzəməmə, oxşamama, fərq, təfavüt, fərqlənmə, müxtəliflik

**dissimilarly** ['dɪ'sɪmɪləlɪ] *adv* oxşar olmayan bir tərzdə, müxtəlif surətdə

**dissimilation** ['dɪsɪmɪ'leɪʃn] *n* 1. ayrılıq, fikir ayrılığı, ziddiyyət, ixtilaf; 2. oxşarlığı / bənzərliyi

itirmə; 3. *dilç.* dissimilyasiya *(bir-birinə bənzər iki səsdən birinin başqa səslə əvəz olunması hadisəsi)*

**dissimulate** [dɪˈsɪmjuleɪt] *v* 1. gizlətmək, örtbasdır etmək; **to ~ one's feelings** hisslərini gizlətmək; 2. riyakarlıq /ikiüzlülük etmək

**dissimulation** [dɪ,sɪmjuˈleɪʃn] *n* 1. gizlətmə, gizli saxlama; 2. *d.d.* yalançılıq, hiyləgərlik, riyakarlıq, ikiüzlülük; *Dissimulation and compromise are inevitable in politics Siyasətdə riyakarlıq və kompromis qaçılmazdır / labüddür*

**dissipate** [ˈdɪsɪpeɪt] *v* 1. dağıtmaq, qovmaq; yox etmək; **to ~ clouds** buludları dağıtmaq; **to ~ darkness** qaranlığı qovmaq; **to ~ sorrow** kədəri/qəmi dağıtmaq; **to ~ fears** qorxunu yox etmək; **to ~ attention** diqqəti yayındırmaq/dağıtmaq; 2. dağılmaq, yox olmaq; itmək, itib getmək; *The clouds dissipated Buludlar dağıldı/yox olub getdi; The mist quickly dissipated as the sun rose Günəş çıxan kimi duman dərhal dağıldı;* 3. ayırmaq *(tərkib hissələrinə)*; **to ~ a substance** maddəni tərkib hissələrinə ayırmaq; 4. xərcləmək, sərf etmək, sovurmaq *(pulunu, varını)*, səmərəsiz/boş yerə xərcləmək, israf etmək; **to ~ one's money** pulunu boş yerə xərcləmək/israf etmək; **to ~ one's fortune** varını/var-dövlətini göyə sovurmaq; **to ~ one's time** vaxtını boş yerə itirmək; **to ~ one's energy** gücünü boş-boşuna israf etmək; 5. *d.d.* gününü/vaxtını kefdə/eyş-işrətdə /əyyaşlıqda keçirmək

**dissipated** [ˈdɪsɪpeɪtɪd] *adj* 1. dağıdılmış, dağılmış, pərən-pərən salınmış / olmuş; səpələnmiş; 2. israf edilmiş, xərclənmiş, sərf edilmiş *(pul, var haq.)*; 3. pozğun, əyyaş, **a ~ life** pozğun həyat; **to lead a ~ life** pozğun həyat sürmək; 4. azğın, yolunu azmış, əxlaqsız, yava

**dissipater** [ˈdɪsɪpeɪtəʳ] *n* 1. bədxərc, israfçı, pul korlayan; 2. kefcil, əyyaş, avara, gəzəyən

**dissipation** [,dɪsɪˈpeɪʃn] *n* 1. dağılma, dağıtma, yox olma, itmə; **~ of heat** istiliyin yox olması; **~ of clouds** buludların dağılması; **~ of energy** *fiz.* enerjinin itməsi; cərəyanın itməsi; 2. parçalanma; dağılma, tənəzzül, süqut; **~ of a molecule** molekulun parçalanması; **~ of a state** dövlətin dağılması/süqutu; 3. bədxərclik, israfçılıq; xərcləmə, sərf etmə, dağıtma *(pulu, varı)*; **~ of time** vaxtı boş-boşuna keçirmə; **~ of energy** enerjini havayı yerə sərf etmə; 4. azdırma, azdırılma; əylənmə, əyləncə; **to allow oneself a little ~** bir az əylənmək; 5. pozğun həyat tərzi, əyyaşlıq, pozğunluq

**dissociable** [dɪˈsouʃəbl] *adj* 1. adamayovuşmaz, adamdanqaçan, ünsiyyətsiz; 2. bir araya sığışmaz, bir araya sığışa bilməyən

**dissociate** [dɪˈsouʃieɪt] *v* ayırmaq, əlaqəsini kəsmək, bir-birindən ayırmaq; **to ~ oneself from others** özünü başqalarından ayırmaq; **to ~ oneself from the opinion** irəli sürülmüş fikirlə razılaşmamaq; *One must dissociate these two ideas Bu iki fikri bir-birindən ayırmaq lazımdır*

**dissociation** [dɪ,sousɪˈeɪʃn] *n* ayırma, ayrılma; bir-birindən ayırma / ayrılma, aralama; əlaqəsini kəsmə / kəsilmə; əlaqəsizlik, rabitəsizlik

**dissolubility** [dɪ,sɔljuˈbɪlɪtɪ] *n* 1. tərkib hissələrinə ayrıla bilmə; 2. ərimə / həll olunma qabiliyyəti, həll ola bilmə

**dissoluble** [dɪˈsɔljubl] *adj* 1. tərkib hissələrinə ayrıla bilən; parçalana bilən; 2. pozula/dağıla bilən; ləğv edilə bilən *(müqavilə, kəbin və s. haq.)*

**dissolute** [ˈdɪsəlu:t] *adj* ədəbsiz, əxlaqsız, pozğun; **~ life** pozğun həyat; **a ~ person** əxlaqsız / pozğun adam; **to lead a ~ life** pozğun həyat sürmək; **a ~ and worthless young man** əxlaqsız və yaramaz gənc

**dissolutely** [ˈdɪsəlu:tlɪ] *adv* əxlaqsızcasına, əxlaqsız, tərbiyəsiz, tərbiyəsizcəsinə, pozğun; **to speak ~** əxlaqsız / tərbiyəsiz danışmaq

**dissoluteness** [ˈdɪsəlu:tnɪs] *n* əxlaqsızlıq, pozğunluq, tərbiyəsizlik

**dissolution** [,dɪsəˈlu:ʃn] *n* 1. ərimə; **~ of ice** buzun əriməsi; 2. dağılma; parçalanma, süqut; tənəzzül; **~ of a state** dövlətin süqutu/dağılması; 3. pozma, ləğv etmə/edilmə *(müqaviləni, kəbini)*; **~ of a treaty** müqaviləni pozma/ləğv etmə; **the ~ of a marriage** boşanma, nikahı pozma; 4. buraxma; bağlama; **~ of Parliament** parlamenti buraxma; 5. ləğv etmə; **~ of a partnership** kampaniyanı ləğv etmə; 6. iflas, dağılma, pozulma; **~ of morals** mənəviyyatın pozulması; 7. ölüm, ölmə, vəfat

**dissolve** [dɪˈzɔlv] *v* 1. əritmək, həll etmək; **to ~ sugar in water** qəndi suda əritmək / həll etmək; *Water dissolves salt Su duzu əridir;* 2. ərimək, həll olunmaq; *Salt/Sugar dissolves in water Duz / Qənd suda əriyir; Wait for the tablet to dissolve Həb əriyənə / həll olunana qədər gözlə/gözləyin; Snow dissolves in the sun Qar günəşdə / günəş altında əriyir;* 3. buraxmaq, fəaliyyətinə son qoymaq; **to ~ Parliament** parlamenti buraxmaq; 4. dağıtmaq, məhv etmək; dağılmaq, məhv olmaq; 5. pozmaq, ləğv etmək; **to ~ a marriage** kəbini pozmaq /ləğv etmək; 6. əlaqəni kəsmək/ itirmək; iflasa uğramaq, uçub dağılmaq; 7. həll etmək *(məsələni)*

**dissolvent**[1] [dɪˈzɔlvənt] *n kim.* əridici, həlledici maddə

**dissolvent**[2] [dɪˈzɔlvənt] *adj* əridici, həlledici

**dissolving** [dɪˈzɔlvɪŋ] *adj* əridən, həll edən; **~ agent** *kim.* əridici/həlledici maddə

**dissonance** [ˈdɪsənəns] *n* 1. *mus.* dissonans *(səslərdə ahəngsizlik / uyğunsuzluq)*; 2. fikir ayrılığı, ixtilaf, uyğunsuzluq

**dissonant** [ˈdɪsənənt] *adj* 1. *mus.* ahəngsiz; köksüz *(mus. aləti haq.)*; 2. uyğunsuz, bir-birinə uyğun gəlməyən; **~ voices** bir-birinə uyğun gəlməyən səslər; ziddiyyətli; bir yerə sığmayan; **~ from the spirit of the poem** poemanın ruhuna uyğun gəlməyən; **~ to truth** həqiqətə zidd; həqiqətə uyğun olmayan/gəlməyən



**dissuade** [dɪˈsweɪd] *v* fikrindən /rəyindən daşındırmaq; **to ~ smb. from smth./from doing smth.** bir kəsi bir şeydən/bir şeyi etmək fikrindən daşındırmaq; *None of their warnings could dissuade her Onların heç bir xəbərdarlığı onu fikrindən daşındıra bilmədi*

**distance**[1] [ˈdɪstəns] *n* 1. məsafə; **a short/long/great ~** qısa/uzun/böyük məsafə; **a ~ of 20 miles** 20 millik məsafə; **at a ~** uzaqda, aralı; **at a visual ~** gözün görə biləcəyi məsafədə; **the ~ from here to Moscow** buradan Moskvaya qədər olan məsafə; **within easy ~** lap yaxın məsafədə; *Our house is within/in walking distance of the school Bizim evdən məktəbə piyada getmək olar; The market is a good distance from here Bazar buradan xeyli uzaqdadır /aralıdır;* **in the ~** uzaqda, uzaq məsafədə; *The station is no distance at all Vağzal tamam yaxındadır;* **from a ~** uzaqdan; **in the ~** uzaqda; **out of ~** çox uzaqda; 2. *id.* distansiya, məsafə; 3. fərq, bənzərsizlik, bənzəməmə; oxşamama; **the ~ between the culture of two countries** iki ölkənin mədəniyyəti arasında fərq; 4. təmkinlilik, səbirlilik; təmkin, səbir; **to keep one's ~, to know one's ~** öz yerini bilmək; **to keep smb. at a ~** bir kəsi yaxına buraxmamaq; 5. müddət, vaxt, fasilə; **~ of time** vaxt müddəti; **the ~ between two events** iki hadisə arasında müddət

**distance**[2] [dɪstəns] *v* 1. müəyyən məsafədə yerləşdirmək; 2. geridə/arxada qoymaq; **to ~ one's rivals** öz rəqiblərini arxada qoymaq; *Her wealth has distanced her from her friends Var-dövlətcə o, dostlarından geridə qalıb*

**distant** [ˈdɪstənt] *adj* 1. uzaq; uzaqlaşdırılmış; uzaqlaşmış; **a ~ city/village** uzaq şəhər / kənd; **a ~ land** uzaq ölkə; **to travel to ~ lands of the world** dünyanın uzaq ölkələrinə səyahət etmək; **the sound of a ~ aeroplane** uzaqdan gələn təyyarənin səsi; *The airport is about ten miles from the city Aeroport şəhərdən on mil uzaqdadır;* **the ~ past** uzaq keçmiş; **a ~ journey** uzaq səyahət *(dənizlə)*; **~ relation** uzaq qohumluq; *The two boys don't look alike, but they are distant relations Bu iki oğlan bir-birinə oxşamır, lakin onlar uzaq qohumdurlar;* 2. zəif, yüngül, gözə çarpmayan; **~ likeness/resemblance** azca/azacıq oxşarlıq; **to have not even a ~ idea of a matter** məsələ barəsində hətta zəif təsəvvürü olmamaq; 3. quru, soyuq; **~ politeness** quru/soyuq nəzakət; **~ manner** quru/iddialı davranış; 4. yad, xas olmayan

**distantly** [ˈdɪstəntlɪ] *adv* 1. uzaqdan; uzaqda, uzaqlarda, uzaqdan-uzağa; *We are distantly related Biz uzaqdan-uzağa qohumuq; She smiled distantly at us O, uzaqdan bizə gülümsədi;* 2. təmkinlə, səbirlə, özünü/ nəfsini saxlayaraq; soyuq

**distaste** [dɪsˈteɪst] *n* 1. sevməmə, antipatiya; iyrəndirmə, çirkindirmə; **~ for smb.** bir kəsə qarşı kin/antipatiya hissi; *He had a distaste for such work Belə iş onu çirkindirirdi;* 2. nifrət; öyümə

**distasteful** [dɪsˈteɪstfl] *adj* pis, nifrət oyadan, xoşagəlməz, iyrənc, çirkin; mənfur, murdar; ürəkbulandırıcı, ürəkbulandıran; **~ scent** xoşagəlməz iy/qoxu; *I find his use of bad language extremely distasteful Onun söyüş söyməsi məndə bərk nifrət oyadır*

**distemper**[1] [dɪsˈtempəʳ] *n* I 1. pis əhval-ruhiyyə / ovqat; qüssə, xiffət, darıxma, ürəyi sıxılma; 2. *bayt.* heyvan taunu *(xüs. itlərdə)*; 3. həyəcan, qarışıqlıq; çaxnaşma, iğtişaş, hərc-mərclik, şuluqluq

**distemper** [dɪsˈtempəʳ] *n* II 1. tempera *(yumurta sarısı qatılmış mədəni boyalar və bu boyalarla çəkilmiş şəkil)*; 2. yapışqanlı boya

**distemper**[2] [dɪsˈtempəʳ] *v* I 1. pərt etmək, ovqatını təlx etmək, kefini pozmaq, qanını qaraltmaq; 2. pozmaq *(sağlamlığı)*; 3. qarışıqlıq / çaxnaşma salmaq

**distemper** [dɪsˈtempəʳ] *v* II 1. tempera ilə çəkmək *(rəsm)*; 2. yapışqanlı boya ilə boyamaq

**distend** [dɪsˈtend] *v* 1. hava doldurmaq; köpdürmək; doldurmaq *(hava ilə, qazla)*; genəltmək, enləmək; **to ~ a bladder** qovuğu hava ilə doldurmaq; **sails ~ed by the wind** küləklə doldurulmuş yelkənlər; 2. hava ilə dolmaq, köpmək; dolmaq *(hava ilə)*, genişlənmək; *His heart distended with pride Onun qəlbi iftixar hissi ilə doldu;* 3. şişmək, köpmək; **starving children with huge ~ed bellies** aclıq çəkən iriqarınlı uşaqlar

**distil(l)** [dɪsˈtɪl] *v* 1. distillə etmək, distillyasiya vasitəsilə təmizləmək/saflaşdırmaq; **to ~ a liquid** mayeni distillə etmək; *This whisky is distilled in Scotland Bu viski Şotlandiyada distillə edilib;* 2. duzdan təmizləmək, içməli hala salmaq *(suyu)*; **to ~ fresh water from sea water** dəniz suyunu duzdan təmizləyib içməli hala salmaq; 3. distillə olunmaq, təmizlənmək; 4. çəkmək *(araq, spirt)*; **to ~ wheat** buğdadan araq çəkmək; çəkmək, distillə etmək yolu ilə almaq; **to ~ spirits from grain** taxıldan spirt almaq; 5. *məc.* mahiyyətini anlamaq / əldə etmək; *He distilled a theory out of his experience Onun təcrübəsindən nəzəriyyə formalaşdı;* 6. sıxmaq, sıxıb çıxartmaq; **to ~ a few drops of poison** sıxıb bir neçə damcı zəhər çıxartmaq; 7. damcı-damcı tökülmək, dammaq, süzülmək; **to ~ in drops** damcı-damcı tökülmək

**distillation** [,dɪstɪˈleɪʃn] *n* 1. distilyasiya, distillə etmə *(mayeləri qaynadaraq əsas tərkib hissələrinə ayırmaqla təmizləmə/saflaşdırma)*; **chemical ~** kimyəvi distillə etmə; 2. mahiyyət; 3. damcı-damcı ayrılma

**distiller** [dɪsˈtɪləʳ] *n* spirt çəkən adam və ya zavod; araqçəkən

**distillery** [dɪs'tɪlərɪ] *n* araqçəkən zavod

**distinct** [dɪs'tɪŋkt] *adj* **1.** aydın, açıq, parlaq, aşkar, açıqdan-açığa; **~ writing** aydın / açıq yazı / xətt; **~ memory** aydın yaddaş; **~ refusal** aşkar imtina; *My recollection of it is distinct Mən bunu tam aydınlığı ilə xatırlayıram;* **~ footprints in the snow** qar üzərində açıq-aşkar ayaq izləri; **2.** müxtəlif, cürbəcür; **~ dialects** müxtəlif dialektlər; **3.** dəqiq; xüsusi; fərdi; **a person of very ~ character** xüsusi xarakterə malik adam; **to have a ~ line of *one's* own** öz yolu ilə getmək; **to keep two things ~** iki müxtəlif şeyi qarışdırmamaq

**distinction** [dɪs'tɪŋkʃn] *n* **1.** fərqləndirmə; tanıma, müəyyən etmə; **2.** fərq, təfavüt; **a fine ~** incə fərq; **vital ~** əsaslı/ciddi fərq; **~ in meaning** mənada fərq; **without ~** fərqsiz, fərq olmadan / qoymadan; **to provide social and political freedom without ~** fərq qoymadan ictimai və siyasi azadlıqla təmin etmək; **in ~ from *smth.*** bir şeydən fərqli olaraq; **to make/ to draw a ~ between two things** iki şeyi fərqləndirmək; *Can you make / draw a distinction between these 2 ideas? Sən / Siz bu iki ideya arasında fərq görürsənmi /görürsünüzmü?;* **to see no ~ between two things** iki şey arasında fərq görməmək; **to get a ~** əla qiymət almaq; *I got a distinction in geography Mən coğrafiyadan əla qiymət aldım*

**distinctive** [dɪs'tɪŋktɪv] *adj* fərqləndirici, fərqləndirmə; səciyyəvi, xarakterik, xüsusi; **~ feature** fərqləndirici / səciyyəvi / xarakterik xüsusiyyət; **a ~ style** xüsusi üslub; **a ~ sign** fərqləndirici işarə; *Each rank in the army has a distinctive sign Orduda hər bir rütbənin fərqləndirici işarəsi var*

**distinctively** [dɪs'tɪŋktɪvlɪ] *adv* aydın, aydın bir surətdə/tərzdə, aşkar, açıq-aydın, açıqdan-açığa

**distinctiveness** [dɪs'tɪŋktɪvnɪs] *n* aydınlıq, açıqlıq

**distinctly** [dɪs'tɪŋktlɪ] *adv* **1.** aydın, aşkar, açıq, açıq-açığına, açıqcasına; **to speak ~** aydın/aşkar danışmaq; **2.** qəti, müəyyən, birmənalı, aşkar surətdə; *It must be distinctly understood Bu qəti/birmənalı olaraq başa düşülməlidir; It was distinctly said that... Qəti olaraq deyilmişdi ki,...* **3.** şübhəsiz, aydınca; **~ better** xeyli yaxşı

**distinctness** [dɪs'tɪŋktnɪs] *n* **1.** aydınlıq, açıqlıq; dəqiqlik, müəyyənlik, qətilik; **2.** xüsusiyyət, orijinallıq

**distinguish** [dɪs'tɪŋgwɪʃ] *v* fərqləndirmək, fərq /təfavüt qoymaq, ayırd etmək; seçmək; **to ~ one thing from another** bir şeyi digər şeydən fərqləndirmək; *The twins are so alike that I can't distinguish one from the other Əkizlər elə oxşardırlar ki, mən onları bir-birindən seçə bilmirəm; The power of speech distinguishes human beings from animals Danışıq qabiliyyəti insanları heyvanlardan fərqləndirir; I could hardly distinguish the car in front because of the fog Duman olduğuna görə mən öndəki/qabaqdakı maşını güclə seçə bildim;* **to ~ oneself** fərqlənmək, seçilmək; *He distinguishes himself by his coolness and bravery O özünün soyuqqanlılığı və cəsarəti ilə seçilir / fərqlənir*

**distinguishable** [dɪs'tɪŋgwɪʃəbl] *adj* fərqləndirilən, fərqləndirilə bilən; seçilən; seçilə bilən; **a hardly ~ sound** güclə/zorla fərqləndirilən səs; *A black object is not easily distinguishable on a dark night Qara şey qaranlıq gecədə asanlıqla seçilmir; Those two objects / ideas are not easily distinguishable from each other O iki şey / fikir bir-birindən asanlıqla fərqlənmir*

**distinguished** [dɪs'tɪŋgwɪʃt] *adj* **1.** məşhur, tanınmış; görkəmli; **a ~ writer / painter / poet *etc.*** məşhur yazıçı/rəssam/şair və s.; **a ~ figure in literature** məşhur/tanınmış / görkəmli ədib; **2.** yüksək mövqe tutan; hörmətli, adlı-sanlı, kübar, əsil-nəcabətli; **a ~ guest** hörmətli qonaq; **~ delegates** hörmətli nümayəndələr *(müraciət);* **of ~ birth** adlı-sanlı/tanınmış ailədən; **3.** zərif, gözəl, incə, nəfis; dəqiq; qeyri-adi; **~ manners** zərif/incə davranış; **~ appearance** zərif / incə görkəm; **~ style** gözəl / incə üslub; *I think grey hair makes you look very distinguished Məncə, boz saç səni / sizi gözəlləşdirir;* **4.** əla, çox yaxşı, qüsursuz

**distinguishing** [dɪs'tɪŋgwɪʃɪŋ] *adj* fərqləndirici; xarakterik, səciyyəvi; **~ features** fərqləndirici cəhətlər / xüsusiyyətlər

**distort** [dɪs'tɔ:t] *v* **1.** korlamaq; dəyişdirmək; əymək; **to ~ *one's* face** üz-gözünü əymək; **a face ~ed by pain** ağrıdan əyilmiş sifət; *His face was distorted with/ by pain Onun sifəti ağrıdan əyilmişdi;* **2.** pozmaq; təhrif etmək; **to ~ facts** faktları təhrif etmək; *Newspapers often distort facts Qəzetlər tez-tez faktları təhrif edir;* **3.** *tex.* formasını/şəklini dəyişdirmək

**distorted** [dɪs'tɔ:tɪd] *adj* **1.** təhrif edilmiş / olunmuş; pozulmuş; mənası dəyişdirilmiş; əyilmiş; **~ face by/with pain** ağrıdan əyilmiş sifət; **~ facts** təhrif edilmiş faktlar; **2.** *tex.* forması / şəkli dəyişmiş

**distortion** [dɪs'tɔ:ʃn] *n* **1.** pozma, pozulma; əymə, əyilmə; **to undergo a sudden ~** qəflətən / qəfildən əyilmək *(sifət haq.);* **2.** əyri / əyilmiş yer/forma; **3.** təhrif etmə /edilmə/olunma; **~ of facts** faktların təhrif olunması / edilməsi; **4.** *tex.* deformasiya *(formanın dəyişməsi)*

**distortionist** [dɪs'tɔ:ʃənɪst] *n* **1.** akrobat, canbaz, sirk artisti; **2.** karikaturaçı; **3.** təhrifçi, təhrif edən adam

**distract** [dɪs'trækt] *v* **1.** ayırmaq, yayındırmaq, uzaqlaşdırmaq, sapdırmaq, azdırmaq; **to ~ *smb.'s* attention / mind from *smth.*** bir kəsin diqqətini/fikrini bir şeydən yayındırmaq; **2.** çaşdırmaq, dolaşdırmaq; karıxdırmaq; *Her mind was distracted by grief Dərd / Kədər onun ağlını çaşdırmışdı;* **to be ~ed with pain** ağrıdan ağlını itirmək / dəli olmaq; *I'm distracted with doubts Şübhələr məni didib-dağıdır*



**distracted** [dɪs'træktɪd] *adj* **1.** çaşdırılmış, karıxdırılmış; pərt edilmiş; həyəcana / təşvişə salınmış; *She looked distracted O, həyəcanlı/pərt görünürdü;* **2.** ağlını itirmiş, dəli olmuş; **to drive *smb.* ~** bir kəsi dəli vəziyyətinə salmaq / dəli etmək; **a ~ person** ruhi xəstə, dəli

**distractedly** [dɪs'træktɪdlɪ] *adv* **1.** dəli kimi, dəlicəsinə; **~ in love with *smb.*** bir kəsi dəlicəsinə / dəli kimi sevmə; **2.** təşviş içində, narahat halda

**distracting** [dɪs'træktɪŋ] *adj* yayındıran, sapdıran, azdıran, dağıdan *(fikri, diqqəti);* **a ~ noise** yayındıran/dağıdan/ azdıran səs *(fikri)*

**distraction** [dɪs'trækʃn] *n* **1.** ayırma, yayındırma, azdırma *(diqqəti);* **2.** huşsuzluq, unutqanlıq, diqqətsizlik; fikir yayğınlığı; **3.** diqqəti yayındıran hər bir şey *(səs və s.); I find it hard to work at home because there are too many distractions Evdə işləmək mənim üçün çətindir, çünki orada çox şey diqqəti yayındırır;* **4.** əyləncə; *TV can be a welcome distraction after a hard day's work Ağır iş günündən sonra televizor yaxşı əyləncə ola bilər;* **5.** çəkişmə, ixtilaf, ədavət, nifaq; **political ~s** siyasi çəkişmələr/ixtilaflar; **6.** çaxnaşma, vəlvələ; həyəcan; təlaş, təşviş; güclü oyanma / həyəcan; ağılsızlıq, dəlilik; **to love *smb.* to ~** bir kəsi dəlicəsinə sevmək; **to drive *smb.* to ~** bir kəsi dəli etmək; *The children are driving me to distraction Uşaqlar məni dəli edirlər*

**distraught** [dɪs'trɔ:t] *adj d.d.* **1.** həyəcanlı, əndişəli, iztirablı; **2.** ağlını / dərrakəsini itirmiş, dəli kimi olmuş, ağılsız, düşüncəsiz; *His mother's death left him distraught Anasının ölümü onu dəli kimi etdi*

**distress[1]** [dɪs'tres] *n* **1.** bəla, fəlakət, bədbəxtlik, müsibət, zaval; dərd, qəm, qüssə, kədər; əzab; **a ~ signal** fəlakət siqnalı; **to send out a ~ signal** fəlakət siqnalı göndərmək; *The girl's leaving home was a great distress to her family Qızın evi tərk etməsi onun ailəsi üçün böyük müsibət/fəlakət/bədbəxtlik idi; Her death was the cause of great distress to all family Bütün ailənin dərin dərd-qəminin səbəbi onun ölümü idi;* **2.** ehtiyac, kasıblıq, səfalət; **to live in ~** yoxsulluq/ səfalət içərisində yaşamaq; **to be in great ~ for money** pula böyük ehtiyacı olmaq;

◊ *Two in distress makes sorrow less at. söz.* ≅ *El ilə gələn (qada-bəla) toy-bayramdır*

**distress[2]** [dɪs'tres] *v* **1.** fəlakətə/müsibətə / bədbəxtliyə səbəb olmaq, fəlakətə/müsibətə/bədbəxtliyə salmaq; əziyyət vermək, əziyyətə salmaq, narahat etmək; **to ~ oneself** narahat olmaq, əziyyətə düşmək, əzab/əziyyət/iztirab çəkmək; **to be ~ed for *smb.*** bir kəs üçün həyəcan keçirmək/narahat olmaq; *It distresses me to give you any trouble Sənə/Sizə əziyyət verdiyim üçün çox mütəəssirəm;* **2.** kasıblıq/yoxsulluq/səfalət vəziyyətinə salmaq

**distressed** [dɪs'trest] *adj* **1.** yoxsulluğa / kasıblığa / fəlakətə düçar olmuş; **2.** fəlakətə / müsibətə düşmüş; qəzaya uğramış

**distressing** [dɪs'tresɪŋ] *adj* **1.** fəlakətli, bədbəxtliyə / fəlakətə səbəb olan; **2.** qəmli, kədərli; **~ news** qəmli / kədərli xəbər; *I found it very distressing when my parents divorced Valideynlərimin boşanması mənim üçün böyük fəlakət/bədbəxtlik idi*

**distressful** [dɪs'tresfl] *adj* **1.** əziyyətli, əzablı, üzücü; dərd/kədər/qəm yaradan; **~ uncertainty** üzücü qeyri-müəyyənlik; **~ situation** fəlakətli / ağır vəziyyət; **2.** kədərli, qüssəli, ələmli, dərdli, iztirablı; çox əziyyət çəkmiş, çox əzab görmüş

**distressingly** [dɪs'tresɪŋlɪ] *adv* əziyyətlə, əzabla, üzücü bir tərzdə

**distribute** [dɪs'trɪbju:t] *v* **1.** bölüşdürmək, bölmək, təqsim etmək, paylamaq; vermək; **to ~ examination-papers to the class** imtahan biletlərini sinfə paylamaq; **to ~ letters among the addresses** məktubları sahiblərinə paylamaq; *The demonstrators distributed leaflets to passers-by Nümayişçilər vərəqələri ötüb-keçənlərə payladılar;* **2.** səpmək, səpələmək; **to ~ fertilizer over the field** gübrəni sahəyə səpmək; **3.** yaymaq, yayılmaq; *This species is distributed all over Europe Bu çeşid/növ bütün Avropaya yayılıb;* **4.** təsnif etmək, bölmək; **to ~ plants into twenty two groups** bitkiləri iyirmi iki qrupa bölmək / təsnif etmək

**distribution** [ˌdɪstrɪ'bju:ʃn] *n* **1.** bölmə, bölüşdürmə, bölünmə, paylanma; paylaşdırma, paylaşdırılma; **~ of books** kitabları bölüşdürmə; **~s of food parcels to the refugees** ərzaq bağlamalarının qaçqınlara paylanması; **2.** yayma, yayılma; yerləşdirmə, yerləşdirilmə; düzmə; **~ of population** əhalini yerləşdirmə; **~ of the stars** ulduzların yerləşməsi; **a rational geographical ~ of industry** sənayenin coğrafi baxımdan səmərəli yerləşdirilməsi; **to have a wide ~** geniş yayılmaq; **3.** təsnifat; bölünmə; **4.** malların daşınması; **5.** *mal.* gəlirlərin bölünməsi; milli gəlirin bölünməsi; **6.** *hüq.* mirasın varislər arasında bölünməsi *(qanuna və ya vəsiyyətə görə)*

**distributive** [dɪs'trɪbjutɪv] *adj* **1.** bölüşdürücü; bölmə ilə məşğul olan; **2.** daşıma ilə məşğul olan; **3.** *qram.* bölüşdürmə; **~ conjunctions** bölüşdürmə bağlayıcıları

**distributor** [dɪs'trɪbjutə[r]] *n* **1.** satış üzrə müvəkkil *(avtomobil və s. satışı üzrə);* **2.** *tex.* motorda alışdırıcı şamlara cərəyan paylayan qurğu

**district[1]** ['dɪstrɪkt] *n* **1.** şöbə, bölmə; dairə *(ərazi bölgüsü vahidi),* sahə; **police ~** polis şöbəsi / bölməsi; **2.** rayon; **rural ~** kənd rayonu; **agri-**

**cultural** ~ kənd təsərrüfatı rayonu; 3. *amer.* seçki məntəqəsi; **congressional/senate** ~ konqresə / senata seçkilər üzrə seçki məntəqəsi

**district[2]** ['dɪstrɪkt] *v* rayona və ya dairəyə bölmək; rayonlaşdırmaq, rayonlara ayırmaq

**district-attorney** ['dɪstrɪktə'tə:nɪ] *n amer.* dairə prokuroru

**district-council** ['dɪstrɪktkaunsl] *n* dairə şurası

**distrust[1]** [dɪs'trʌst] *n* inamsızlıq, etibarsızlıq, etimadsızlıq; şübhə, şəkk; **to hold** *smb.* **in** ~ bir kəsə inanmamaq, bir kəsdən şübhələnmək; **to look at** *smb.* **with** ~ bir kəsə şübhə ilə baxmaq; *She eyed me with distrust O mənə şübhəli-şübhəli baxdı*

**distrust[2]** [dɪs'trʌst] *v* inanmamaq, şübhələnmək; **to** ~ *one's* **own eyes** öz gözlərinə inanmamaq

**distrustful** [dɪs'trʌstful] *adj* heç kəsə inanmayan / etibar etməyən, hər şeydən şübhələnən; həddindən artıq ehtiyatlı; ~ **of oneself** özünə / öz gücünə inanmayan

**disturb** [dɪs'tə:b] *v* 1. narahat etmək; rahatlığını pozmaq; **to** ~ *smb.* bir kəsi narahat etmək, bir kəsin rahatlığını pozmaq; *Don't disturb father Atanı/Atanızı narahat etmə/etməyin; Don't disturb yourself Özünü / Özünüzü narahat etmə / etməyin; Sorry to disturb you Səni / Sizi narahat etdiyim üçün üzr istəyirəm; Keep the noise down! You'll disturb the neighbours Səs salma/salmayın! Qonşuları narahat edərsən / edərsiniz;* 2. pozmaq; **to** ~ *smb.'s* **rest** bir kəsin rahatlığını pozmaq; **to** ~ **the peace** sakitliyi / ictimai asayişi pozmaq; **to** ~ *smb.'s* **plans** bir kəsin planlarını pozmaq; 3. mane olmaq; **to** ~ *smb.'s* **work** bir kəsin işinə mane olmaq; 4. xarab etmək, korlamaq; **to** ~ **the apparatus** cihazı xarab etmək/korlamaq; *Don't disturb my papers Mənim kağızlarıma əl vurma/ vurmayın*

**disturbed** [dɪs'tə:bd] *adj* ruhi xəstə; *She teaches children who are disturbed O, ruhi xəstə uşaqlara dərs deyir*

**disturbance** [dɪs'tə:bəns] *n* 1. sakitliyi/rahatlığı /müvazinəti pozma; 2. *həm də pl* vəlvələ, çaxnaşma, həyəcan, təşviş, qarışıqlıq, iğtişaş, şuluqluq; **to make / to cause a** ~ 1) qarışıqlıq / iğtişaş salmaq; 2) səs-küy qaldırmaq, ictimai asayişi pozmaq; 3. həyəcan, narahatlıq, ruhi pozğunluq; 4. narazılıq, pozulma, korlanma; 5. *hüq.* hüquqdan istifadəyə mane olma; ~ **of franchise** seçki hüququnun pozulması, seçkiyə buraxmama; 6. *tib.* pozma, pozulma; patoloji pozulma; ~ **of respiration** nəfəsalmanın pozulması; ~ **of speech** nitqin pozulması

**disunion** ['dɪs'ju:njən] *n* 1. ayırma, aralama, ələqəsini kəsmə, əlaqəsi kəsilmə; parçalama, parçalanma; ayrılıq, əlaqəsizlik, rabitəsizlik; 2. fikir ayrılığı, ixtilaf; ziddiyyət; ikitirəlik

**disunite** ['dɪsju:'naɪt] *v* bölmək; ayırmaq; parçalamaq; əlaqəsini kəsmək; təfriqə salmaq; **to** ~ **parties** partiyaları parçalamaq

**disunity** ['dɪs'ju:nɪtɪ] *n* 1. birliyin olmaması; 2. = **disunion**

**disuse[1]** ['dɪs'ju:s] *n* işlənməmə, istifadə edilməmə/olunmama, istifadədən çıxma; **to fall / to come / to get into** ~ istifadə olunmama, istifadədən çıxma; *This word has fallen into disuse Bu söz istifadədən çıxıb/işlənmir; The mine fell into disuse Bu şaxtadan istifadə olunmur / edilmir*

**disuse[2]** ['dɪs'ju:z] *v* işlənməmək, istifadədən çıxmaq

**disused** [.dɪsju:zd] *adj* istifadə olunmayan, istifadədən çıxmış, işlənməyən; ~ **words** istifadədən çıxmış/işlənməyən sözlər; **a** ~ **railway line** istifadə olunmayan/edilməyən dəmiryol xətti

**disvalue** [dɪs'vælju:] *v* qiymət verməmək, qiymətini azaltmaq, qiymətdən salmaq

**disyllabic** ['dɪsɪ'læbɪk] *adj* ikihecalı *(şer)*

**disyoke** [dɪs'jouk] *v* 1. azad etmək, zülmdən qurtarmaq / xilas etmək; 2. qoşqudan açmaq, boyunduruğunu çıxartmaq, boyunduruqdan açmaq *(kəli, öküzü)*

**ditch[1]** [dɪtʃ] *n* 1. xəndək, qanov, ensiz arx; kanal; küvet *(qala divarının qabağında su ilə doldurulmuş xəndək; şose və ya dəmir yolu boyunca gedən su arxı);* 2. səngər; 3. *tex.* özül yeri, özül üçün çuxur; çala; him

**ditch[2]** [dɪtʃ] *v* 1. xəndək /qanov qazmaq, kanal çəkmək; 2. drenaj kanalları çəkməklə torpağı qurutmaq; **to** ~ **a swamp** bataqlığı qurutmaq; 3. xəndəyi/arxı/kanalı/qanovu təmizləmək; 4. qanova atmaq / tullamaq; qəzaya uğratmaq; 5. *av.* məcburi olaraq təyyarəni suya endirmək; *Sudden engine failure forced the pilot to ditch in the sea Mühərrikin qəfildən xarab olması təyyarəçini təyyarəni dənizə endirməyə məcbur etdi*

**ditcher** ['dɪtʃər] *n* 1. yerqazan fəhlə, qazmaçı; 2. qanovqazan maşın/ekskavator; 3. *k.t.* şumlayıcı; ikihoplu kotan

**dither[1]** ['dɪðər] *n d.d.* çaxnaşma, vəlvələ, həyəcan; təlaş, təşviş; böyük həyəcan/ehtiras/oyanma; *He is in a terrible dither over whether to accept this new job offer O, iş haqqındakı yeni təklifi qəbul edib etməmək barədə ciddi təlaş/təşviş keçirdi*

**dither[2]** ['dɪðər] *v* təşvişə/həyəcana/vəlvələyə salmaq, təşviş / həyəcan / təlaş içində olmaq; bir işi görmək haqqında tərəddüd keçirmək / etmək; *Stop dithering about or we'll be late! Bu tərəddüddən əl çək/ çəkin, yoxsa biz gecikəcəyik*

**ditto[1]** ['dɪtou] *n (pl* **-os** [ouz]) həmin qədər/ miqdar, eyni, eyni ilə; *She came in late last night and ditto the night before O, dünən axşam gec gəldi, eyni ilə də srağagün;*

◊ **to say** ~ **to** *smb.* bir kəsə bəli-bəli / hə-hə demək, bir kəslə razılaşmaq

**ditto[2]** ['dɪtou] *adv* eyni, eyni qaydada, eyni cür; **to act** ~ eyni cür hərəkət etmək

**ditty** ['dɪtɪ] *n* qısa mahnı/nəğmə, meyxana



**diuretic[1]** [.daɪjuə'retɪk] *n tib.* sidikqovucu dərman

**diuretic[2]** [.daɪju'retɪk] *adj tib.* sidikqovan, sidikqovucu

**diurnal** [daɪ'ə:nl] *adj* 1. gündəlik, bir gündə yerinə yetirilən; 2. gündüz; ~ **hours** gündüz saatları; ~ **star** *şair.* günəş; 3. *astr.* gün uzunu; **the** ~ **rotation of the earth** yerin gün uzunu fırlanması

**divan[1]** [dɪ'væn] *n* I 1. taxt, divan; 2. kofe verilən/papiros çəkilən otaq; 3. siqaret dükanı

**divan** [dɪ'væn] *n* II divan *(Türkiyədə dövlət şurası);* divanın iclas keçirdiyi zal

**divan** [dɪ'væn] *n* III divan, lirik şerlər toplusu *(şərq poeziyasında)*

**dive[1]** [daɪv] *n* 1. suya atılma/tullanma *(adət. başıaşağı),* girmə, baş vurma, dalma *(suya);* 2. *id.* başı üstə və ya ayaqla suya girmə; **running** ~ qaçaraq suya tullanma; **standing** ~ yerində dayanaraq suya tullanma; **to take a running** ~ qaçaraq suya tullanmaq; **compulsory** ~ suya məcburi / proqram üzrə tullanma; **free ~s** suya sərbəst tullanma; 3. qəfil hərəkət, atılma, tullanma, soxulma; **to make a** ~ **into a shop** dükana soxulmaq; 4. *dən.* dalma, batma *(sualtı qayıq haq.);* 5. *av.* şığıma; 6. *amer.* şərab/çaxır anbarı; pivəxana; qumarxana, tiryəkxana; 7. ucuz restoran, qəlyanaltı, qəlyanaltı dükanı; 8. yeraltı tunel *(nəqliyyat üçün)*

**dive[2]** [daɪv] *v* 1. suya tullanmaq / atlanmaq; baş vurmaq, cummaq, dalmaq *(suya);* **to** ~ **for pearls** mirvari üçün suya baş vurmaq; *He dived from the bridge to rescue the drowning child O, batan uşağı xilas etmək üçün körpüdən suya tullandı/atıldı;* 2. *dən.* dalmaq, suyun altına girmək *(sualtı qayıq haq.);* 3. *av.* şığımaq; 4. gözdən itmək, yox olmaq; **to** ~ **into the bushes** kol-kosun içində gözdən itmək; **to** ~ **down an alley** xiyabanın dərinliyində yox olmaq/gözdən itmək; 5. dalmaq; aludə olmaq; **to** ~ **into** *one's* **work** öz işinə aludə olmaq; 6. soxmaq, əlini salmaq; **to** ~ *one's* **hand into** *one's* **pocket** əlini cibinə soxmaq/salmaq; 7. suyun altında üzmək

**diver** ['daɪvər] *n* 1. dalğıc; 2. *id.* suya hoppanan idmançı; 3. mirvari/dürr axtaran; 4. *d.d.* cibgir, cibəgirən, cibkəsən

**diverge** [daɪ'və:dʒ] *v* 1. ayrılmaq, dağılmaq *(şüa, yol və s. haq.); Their paths diverged Onların yolları ayrıldı; After that our paths diverged and I never saw him again Ondan sonra bizim yollarımız ayrıldı və mən onu bir daha görmədim;* 2. kənara çıxmaq, əl çəkmək, dönmək, aralanmaq; **to** ~ **from the truth /norm** həqiqətdən / normadan uzaqlaşmaq / aralanmaq; **to** ~ **from a straight line** düz xətdən kənara çıxmaq; **to** ~ **from an opinion** fikrindən əl çəkmək; **to** ~ **from a promise** vədindən dönmək; 3. fərqlənmək; *Our views diverged so greatly that we could never agree on anything Bizim baxışlarımız elə ciddi fərqlənirdi ki, biz heç vaxt heç nədə razılığa gələ bilmirdik*

**divergence** [daɪ'və:dʒəns] *n* ayrılma, aralanma; ayrılıq, ziddiyyət; kənara çıxma, uzaqlaşma; fərq; **the** ~ **between theory and practice** nəzəriyyə ilə praktika arasında ziddiyyət

**divergent** [daɪ'və:dʒənt] *adj* müxtəlif, fərqli; ~ **paths** müxtəlif yollar/cığırlar; ~ **opinions** müxtəlif fikirlər

**diverse** [daɪ'və:s] *adj* müxtəlif, cürbəcür, çeşidli; ~ **subjects** müxtəlif mövzular/ fənlər; **a collection of essays on** ~ **subjects** müxtəlif mövzular üzrə oçerklər toplusu; ~ **persons** müxtəlif / cürbəcür adamlar; *Diverse persons were present at the demonstration Nümayişdə müxtəlif adamlar vardı;* **many** ~ **interests** çox müxtəlif maraqlar; **people from** ~ **cultures** müxtəlif mədəniyyətə mənsub adamlar; *Her interests are very diverse Onun maraqları çox müxtəlifdir;* ~ **judgements upon the subject** məsələ üzrə müxtəlif mühakimələr / fikirlər / rəylər

**diversification** [daɪ.və:sɪfɪ'keɪʃn] *n* 1. ayrılma, aralanma; ayrılıq; 2. cürbəcürlük, müxtəliflik, başqa-başqalıq, çeşidlilik

**diversified** ['daɪ'və:sɪfaɪd] *adj* cürbəcür, müxtəlif, çeşidli, dürlü-dürlü, dəyişkən; ~ **farming** çoxsahəli kənd təsərrüfatı; müxtəlif sahəsi olan kənd təsərrüfatı

**diversify** [daɪ'və:sɪfaɪ] *v (pt, pp* **–fied**) cürbəcür /müxtəlif etmək, müxtəlifləşdirmək; eyni şeyi müxtəlif/cürbəcür şəkildə göstərmək; **to** ~ *one's* **skills/interests** bacarığını/marağını müxtəlifləşdirmək

**diversion** [daɪ'və:ʃn] *n* 1. əymə, əyilmə, yana çəkmə/çəkilmə; çəkilmə, geri çəkilmə; 2. *məc.* uzaqlaşma, boyun qaçırma, imtina etmə; 3. yayındırma, ayırma, uzaqlaşdırma; ~ **of the mind from** *smth.* bir şeydən diqqəti / fikri yayındırma; 4. əyləncə, əyləndirmə, əyləndirilmə; oyun; **the ~s of the city life** şəhər həyatının əyləncələri; **out-door ~s** açıq havada keçirilən oyunlar / əyləncələr; **the ~s of youth** gənclik əyləncələri; *It's difficult to concentrate when there are so many diversions Bu qədər əyləncə olan zaman diqqəti cəmləşdirmək çətindir;* 5. çəkmə, çəkilmə; ~ **of traffic** hərəkəti bir tərəfə çəkmə; ~ **of a stream from its channel** axının öz yatağını dəyişməsi; 6. *hərb.* yalançı/diqqəti yayındırmaq üçün hücum

**diversity** [daɪ'və:sɪtɪ] *n* 1. cürbəcürlük, müxtəliflik, başqa-başqalıq, çeşidlilik; **a wide** ~ **of opinions** fikirlərin geniş müxtəlifliyi/çeşidliliyi; 2. fərq, təfavüt; fərqlənmə; ayrılıq, oxşarsızlıq, oxşar olmama; 3. xüsusiyyət, orijinallıq; ~ **of tastes** zövqlərin xüsusiyyəti; 4. növ müxtəlifliyi; növ

**divert** [daɪ'və:t] *v* 1. başqa istiqamətə yönəltmək, dəyişmək; **to** ~ **the course of a river** çayın ya-

tağını dəyişmək; *They diverted the river to supply water somewhere else Başqa yerləri də su ilə təmin etmək üçün onlar çayın yatağını dəyişdilər;* 2. yayındırmaq, uzaqlaşdırmaq; **to ~ *smb.* from a purpose** bir kəsi məqsədindən yayındırmaq, bir kəsi məqsədindən əl çəkməyə məcbur etmək; 3. əyləndirmək; könlünü açmaq; şənləndirmək; **to ~ *smb.* with an amusing story** bir kəsi məzəli əhvalatla əyləndirmək; *Children are easily diverted Uşaqları asanlıqla əyləndirmək olur*

**diverting** [daɪ'və:tɪŋ] *adj* əyləndirici, şənləndirici

**divest** [daɪ'vest] *v* 1. soyundurmaq, geyimini / paltarını çıxartmaq; **to ~ oneself of *one's* garment** geyimini soyunmaq; 2. məhrum etmək, əlindən almaq; **to ~ *smb.* of his right** bir kəsi hüququndan məhrum etmək; **to ~ *smb.* of his rank** bir kəsi rütbədən məhrum etmək; 3. imtina etmək, əl çəkmək; yaxa qurtarmaq, xilas olmaq; başından çıxartmaq; *I can't divest myself of the idea Mən bu fikirdən yaxa qurtara bilmirəm / xilas ola bilmirəm; He could not divest himself of the suspicion that his wife was being unfaithful O, arvadının ona etibarsızlıq etməsi haqda şübhədən xilas ola bilmirdi*

**divide[1]** [dɪ'vaɪd] *n* bölgü; təqsim; *amer.* su bölümü həddi;
◊ **the Great Divide** *şair.* həyatla ölüm arasındakı hədd; **to go over the Divide** dünyasını dəyişmək, ölmək, vəfat etmək

**divide[2]** [dɪ'vaɪd] *v* 1. bölmək; **to ~ *smth.* into two, three, four, *etc.* parts** bir şeyi iki, üç, dörd və s. hissələrə bölmək; **to ~ (up) a novel into chapters** romanı fəsillərə bölmək; *The children were divided (up) into small groups Uşaqları kiçik qruplara böldülər;* 2. bölüşdürmək; **to ~ (out / up) the money / food** pulu / ərzağı bölüşdürmək; *We divided the work between us Biz işi aramızda bölüşdürdük;* 3. ayırmaq; **to ~ a mother from her baby** ananı baladan ayırmaq; **to ~ *one's* hair in the middle** saçını ortadan ayırmaq; *The English Channel divides England from France İngilis Kanalı İngiltərəni Fransadan ayırır;* 4. bölünmək, hissələrə ayrılmaq; **to ~ into small groups** kiçik qruplara bölünmək; 5. *riyaz.* bölmək, bölgü əməliyyatı aparmaq; **to ~ 60 by 12** 60-ı 12-yə bölmək; 6. təsnif etmək; 7. əlaqəsini kəsmək, təcrid etmək; **to ~ *smb.* from the world** bir kəsi dünyadan ayırmaq / təcrid etmək; 8. fərqlənmək; nifaq /fikir ayrılığı / narazılıq salmaq; *Opinions are divided on the point Bu məsələdə fikirlər fərqlənir; The parties divided on the point Bu məsələdə partiyalar arasına nifaq düşdü;*
◊ *Divide and rule Parçala və hökm sür*

**divided** [dɪ'vaɪdɪd] *adj* 1. hissə-hissə, hissələrinə bölünmüş; **~ payments** hissə-hissə ödəmə; 2. *bot.* yarılmış, bölünmüş *(yarpaq haq.)*; 3. fikircə/rəycə fərqlənən, başqa rəydə/fikirdə olan; 4. dərəcələrə ayrılmış / bölünmüş

**dividend** ['dɪvɪdend] *n* 1. dividend, qazanc payı *(müəssisə şəriklərinin qoymuş olduqları kapitala görə aldıqları mənfəət);* **to pay a ~** dividend/qazanc payı vermək; 2. pay, bölünən

**dividers** [dɪ'vaɪdəz] *n pl* ölçmə/bölmə pərgarı

**divination** [ˌdɪvɪ'neɪʃn] *n* fal açma, fala baxma; cadu, ovsun, fal

**divine[1]** [dɪ'vaɪn] *n* 1. ilahiyyatçı *(ilahiyyat mütəxəssisi; ruhani məktəbinin şagirdi);* 2. keşiş

**divine[2]** [dɪ'vaɪn] *adj* 1. dini; ilahi; **~ will** *din.* allah / allahın əmri; **~ wisdom** ilahi müdriklik; **Divine Comedy** İlahi Komediya; 2. müqəddəs, pak; dini; **~ service** kilsə ibadəti; ibadət; 3. çox gözəl, valehedici, məftunedici, çox qəşəng; **~ hat** çox gözəl/qəşəng şlyapa; *You look simply divine, darling Əzizim, sən / siz çox gözəl görünürsən / görünürsünüz;* **~ weather** çox gözəl hava

**divine[3]** [dɪ'vaɪn] *v* 1. qabaqcadan xəbər vermək, gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək; 2. qabaqcadan bilmək/duymaq/sezmək/anlamaq/başa düşmək; intuitiv başa düşmək /anlamaq; **to ~ *smb.'s* intentions** bir kəsin niyyətini / fikrini başa düşmək; **to ~ the meaning of *smth.*** bir şeyin mənasını başa düşmək / anlamaq

**divinely** [dɪ'vaɪnlɪ] *adv* 1. ilahi, qəşəng, qəribə; 2. son dərəcə gözəl, valehedici bir tərzdə, əla, çox yaxşı

**diviner** [dɪ'vaɪnəʳ] *n* gələcəkdən xəbər verən, qabaqcadan xəbər verən; kahin

**diving[1]** ['daɪvɪŋ] *n* 1. baş vurma, cumma *(suya);* 2. *id.* tramplindən suya tullanma; **long ~** *id.* suyun altı ilə uzununa üzmə; **head first ~** *id.* başıüstə cumma *(suya);* 3. batma *(sualtı qayıq haq.);* 4. dalğıc işi / sənəti; 5. *av.* şığıma

**diving[2]** ['daɪvɪŋ] *adj* 1. cuman, suya atılan; 2. *av.* şığıyan

**diving-bell** ['daɪvɪŋbel] *n* dalğıc zəngi

**diving-board** ['daɪvɪŋbɔ:d] *n* suya tullanmaq üçün tramplin

**diving-dress** ['daɪvɪŋdres] *n* dalğıc paltarı / geyimi, skafandr

**diving-helmet** ['daɪvɪŋˌhelmɪt] *n* dalğıc dəbilqəsi / şlemi

**divinify** [dɪ'vɪnɪfaɪ] *v* ilahiləşdirmək, təqdis etmək; pərəstiş / sitayiş etmək

**divinity** [dɪ'vɪnɪtɪ] *n* 1. ilahilik; ülviyyət; **the ~ of Christ** İsanın ilahiliyi/ülviyyəti; 2. Allah; sitayiş; səcdəgah; **the Roman / Greek/Egyptian divinities** Roma/yunan/ Misir allahları; 3. ilahiyyat *(dini nəzəriyyələr / elm)*

**divisibility** [dɪˌvɪzɪ'bɪlɪtɪ] *n* bölünmə, bölünə bilmə; **~ of matter** materiyanın/maddənin bölünməsi

**divisible** [dɪ'vɪzəbl] *adj riyaz.* bölünən; *8 is divisible by 2 and 4, but not 3 8 2-yə və 4-ə bölünür, lakin 3-ə yox*



**division** [dɪ'vɪʒn] *n* 1. bölgü; **the ~ of labour** əmək bölgüsü; **a fair / unfair ~ of money** pulun ədalətli / ədalətsiz bölgüsü /bölünməsi; 2. *riyaz.* bölmə; **simple ~** sadə/qalıqsız bölmə; *Are you good at division? Sən/Siz bölmə əməliyyatını yaxşı bilirsən/bilirsiniz?;* 3. narazılıq, fikir ayrılığı, ixtilaf; ziddiyyət; nifaq, çəkişmə; **to cause/to stir up ~s** narazılıq/nifaq/ ixtilaf salmaq; 4. seçki zamanı fikirlərin parçalanması/bölünməsi; səsvermə; **without a ~** səsverməyə/səsə qoymadan; *The Bill was read without a division Layihə bir səslə qəbul edildi;* 5. təsnifat, təsnif etmə; 6. *bot.* növ; 7. dairə; mahal *(ərazi bölgü vahidi);* **administrative ~** inzibati bölgü; 8. *amer.* şöbə, bölmə; **~ of modern languages** müasir dillər şöbəsi/ bölməsi *(bir neçə fakültənin birləşməsi);* 9. *hərb.* diviziya; 10. *dən.* divizion *(bir tipdən olan hərbi gəmilər dəstəsi);* 11. *id.* divizion; qrup, dəstə; liqa; *Our team plays in the first division Bizim komanda birinci dəstədə/liqada oynayır;* 12. parlament üzvlərinin qruplaşması / bölünməsi

**divisional** [dɪ'vɪʒənl] *adj* 1. bölən, ayıran, ayırıcı, bölücü; 2. *hərb.* diviziya; **~ commander** diviziya komandiri

**divisive** [dɪ'vaɪsɪv] *adj* narazılıq/fikir ayrılığı/ziddiyyət yaradan; **a ~ issue** narazılıq/fikir ayrılığı/ziddiyyət yaradan məsələ; *These issues are divisive Bu məsələlər narazılıq/fikir ayrılığı yaradır;* **a ~ policy** narazılıq / ziddiyyət yaradan siyasət

**divisiveness** [dɪ'vaɪsɪvnɪs] *n* mübahisəlilik, mübahisəli / davalı / əngəlli olma

**divisor** [dɪ'vaɪzəʳ] *n riyaz.* bölən; *When 15 is divided by 3, the number 3 is the divisor 15-i 3-ə bölərkən 3 rəqəmi bölən olur*

**divorce[1]** [dɪ'vɔ:s] *n* 1. boşama, boşanma, ayrılma *(ər-arvad haq.);* **bill of ~** boşanma haqqında məhkəmənin qərarı, boşanma haqqında sənəd; **to ask for a ~** boşanma haqqında məsələ qaldırmaq; **to get /to obtain a ~** boşanmaq, boşamaq; **grounds for ~** boşanmanın səbəbləri; *My uncle has divorced his wife Mənim dayım/əmim arvadını boşayıb;* 2. uyğunsuzluq, ayrılıq; uçurum; **the ~ between the religion and science** din və elm arasında uçurum

**divorce[2]** [dɪ'vɔ:s] *v* 1. boşanmaq; ayrılmaq; **to ~ *smb.*** bir kəsdən boşanmaq; bir kəsi boşamaq *(məhkəmə vasitəsilə);* **to be ~d from *smb.*** bir kəsdən boşanmaq; *They divorced each other Onlar boşandılar; He divorced and later remarried O, boşandı və bir az sonra yenidən evləndi; The court divorced them Məhkəmə onları boşadı/ayırdı;* 2. kəsmək, qırmaq, üzmək *(əlaqəni);* ayırmaq; **to ~ form from matter** formanı məzmundan ayırmaq; *You can't divorce science from ethical questions Elmi etik/əxlaqi məsələlərdən ayıra bilməzsən / bilməzsiniz*

**divorcé** [dɪˌvɔ:'seɪ] *n fr.* arvadını boşamış ər

**divorced** [dɪˌvɔ:'st] *adj* 1. boşanmış; *Many divorced men remarry and have second families Bir çox boşanmış kişilər yenidən evlənir və ikinci dəfə ailə qururlar;* 2. aralı, uzaq *(bir şeydən); He seems completely divoced from reality O, həqiqətdən tamamilə uzaq görünür*

**divorcee** [dɪˌvɔ:'seɪ] *n fr.* boşanmış arvad

**divorcement** [dɪ'vɔ:smənt] *n* boşanma; **bill of ~** boşanma haqqında arayış *(məhkəmənin verdiyi)*

**divot** ['dɪvət] *n* çim

**divulgation** [ˌdaɪvʌl'geɪʃn] *n* yayma *(xəbəri);* açma, hamıya bildirmə *(sirri);* elan etmə

**divulge** [daɪ'vʌldʒ] *v* aləmə yaymaq, hamıya bildirmək, car çəkmək, açıb söyləmək, açmaq *(sirri);* **to ~ a secret** sirri açmaq / açıb söyləmək / aləmə yaymaq; *I can't divulge how much it cost Mən onun neçəyə olduğunu açıb deyə bilmərəm*

**divulgence** [daɪ'vʌldʒəns] *n* = **divulgation**

**dizzily** ['dɪzɪlɪ] *adv* başgicəlləndirici bir surətdə / tərzdə; bihuş halda

**dizziness** ['dɪzɪnɪz] *n* başgicəllənmə, başgicəllənməsi

**dizzy[1]** ['dɪzɪ] *adj* (-ier, -iest) 1. başgicəllənməsi hiss edən, ürəyi bulanan; *I am quite dizzy Mənim bərk başım gicəllənir; It made me dizzy Bu mənim başımı gicəllətdi;* 2. başgicəldən, başgicəlləndirən, başgicəlləndirici; bihuş edən; **~ climb / height** başgicəlləndirici yoxuş /yüksəklik; **~ with happiness** xoşbəxtlikdən bihuş olmuş; *After my second glass of whisky I began to feel rather dizzy Viskidən iki qədəh içdikdən sonra mənim başım gicəllənməyə başladı;* 3. ağılsız, səfeh, gic *(xüs. qadınlar haq.)*

**dizzy[2]** ['dɪzɪ] *v* 1. baş gicəlləndirmək, bihuş etmək, kefləndirmək; 2. son dərəcə heyrətləndirmək / heyrətə salmaq; çaşdırmaq, karıxdırmaq

**do[1]** [du:] *n* (*pl* **dos, do's** [du:z]) 1. *d.d.* aldatma; aldanma, yalan, hiylə, kələk, fırıldaq, hiyləgərlik, dələduzluq; *Nothing but a do Əsl hiyləgərlik / dələduzluq;* 2. *d.d.* əyləncə, şənlik; qonaqlıq; *We've got a do on tonight Bu axşam bizim qonaqlığımız / şənliyimiz var;* 3. *d.d.* xidmət; *One gets a poor do at this hotel Bu mehmanxanada xidmət pisdir*

**do[2]** [du:] *v* *(əsas fel: tam tələffüz forması:* [du, də], *reduksiya olunmuş tələffüz forması:* [d] *(pt* **did** [dɪd], *pp* **done** [dʌn]; *indiki zamanın qeyri-müəyyən formasında üçüncü şəxs tək forması:* **does** [dʌz]) 1. etmək; *What are you doing? Sən / Siz nə edirsən / edirsiniz? I am doing nothing Mən heç nə etmirəm; What can I do for you? Sənə/Sizə nə (kömək) edə bilərəm? Do as you are told Sənə/Sizə nə deyiblər, elə də et / edin; He won't do anything to you O sənə / sizə heç nə etməz, O sənin / sizin xətrinə / xətrinizə dəyməz; What is to be done? Nə etmək olar?; You did well to refuse his invitation Sən / Siz onun dəvətini qə-

*bul etməməkdə yaxşı iş gördün/ gördünüz;* **to ~ right / wrong** düz / səhv hərəkət etmək; *What are you going to do about it? Sən / Siz bu barədə nə etmək fikrindəsən / fikrindəsiniz?;* 2. işləmək, işlə məşğul olmaq, məşğul olmaq; *What does he do? O nə ilə məşğul olur? What does he do for a living? O yaşamaq üçün nə işlə məşğul olur?;* **to ~ odd jobs** təsadüfi işlə məşğul olmaq; 3. yerinə yetirmək, iş görmək, həyata keçirmək; **to ~ one's work** öz işini görmək; **to ~ one's duty** öz vəzifəsini yerinə yetirmək; **to ~ smb.'s will** bir kəsin arzusunu / istəyini yerinə yetirmək; *The amount of work he has done is amazing Onun gördüyü işin həcmi heyrətləndiricidir;* **to ~ one's best / one's utmost** əlindən gələn hər şeyi etmək; 4. yaramaq, kifayət etmək, yetmək, münasib olmaq, əl vermək; *This room will do for the office Bu otaq ofis üçün yarayar; That will do (Bu) yetər, (Bu) kifayətdir; That will not do Bu yaramaz; Belə olmaz / yaramaz; That will not do (for) me Bu məni qane etmir; One bed did for two men Bir çarpayı iki nəfərə kifayət etdi, İki nəfər bir çarpayı ilə keçindilər; Will these shoes do you? Bu ayaqqabı sənə/sizə yarayarmı?* 5. keçinmək, kifayətlənmək; *Can you do without cigarettes? Sən/Siz siqaretsiz keçinə bilərsənmi/bilərsinizmi? I could do without him Mən onsuz keçinə bilərdim;* 6. *d.d.* aldatmaq, kələk / fırıldaq gəlmək; *I am afraid you have been done Qorxuram ki, səni / sizi aldadıblar; He did me over that Burada o məni aldatdı;* 7. gətirmək, vermək *(xeyir və s.);* **to ~ good** xeyir gətirmək / vermək; *A long walk will do you good Uzun gəzinti sənin/sizin üçün çox faydalı olar; Did the medicine do you any good? Dərman sənə/sizə bir kömək etdimi?;* 8. vurmaq, yetirmək *(zərər, ziyan və s.);* **to ~ harm** ziyan/zərər vermək/vurmaq; 9. göstərmək *(xidmət və s.);* **to ~ (smb.) a favour** bir kəsə xidmət göstərmək; **to ~ smb. a good / a bad turn** bir kəsə yaxşı / pis xidmət göstərmək; **to ~ justice** 1) haqq vermək/qazandırmaq; xidmətinə görə qiymətləndirmək; 2) ədalət xatirinə / naminə; *To do him justice, he is no fool Ədalət naminə demək lazımdır ki, o əsla axmaq deyil;* 10. məşğul olmaq *(hər hansı bir fəaliyyət növü ilə);* **to ~ lecturing /painting/gardening** mühazirə oxumaqla/şəkil çəkməklə/bağçılıqla məşğul olmaq; *I have done enough reading for today Bu gün mən kifayət qədər oxumuşam;* 11. öyrənmək *(fənni); He is doing English at school O, məktəbdə ingilis dili öyrənir; I can't do Latin Mən latın dilini öyrənə bilmirəm;* 12. yazmaq *(məqalə və s.);* **to ~ articles for a magazine** jurnala məqalələr yazmaq; *He did an article on history O, tarixə dair məqalə yazdı;* **to ~ a book** kitab yazmaq; 13. çəkmək *(şəkil və s.); He is doing my sister's portrait O mənim bacımın şəklini çəkir;* 14. həll etmək *(məsələ və s.);* **to ~ a sum / a problem** hesab məsələsini həll etmək; 15. rol oynamaq; *He does Hamlet very well O, Hamlet rolunu yaxşı oynayır;* 16. yığışdırmaq, səliqəyə / qaydaya salmaq *(otağı və s.);* **to ~ the room** otağı yığışdırmaq / səliqəyə salmaq; **to ~ the beds** çarpayıları yığışdırmaq / səliqəyə salmaq; **to ~ one's hair** saçını qaydaya / səliqəyə salmaq; 17. bişirmək, hazırlamaq *(yeməyi),* qızartmaq, buğda bişirmək və s.; *Do the beets with vinegar Çuğunduru sirkə ilə hazırla/hazırlayın; I like my meat very well done Mən yaxşı bişmiş əti xoşlayıram; Is the meat done yet? Ət hələ yaxşı bişməyib?;* **to ~ smth. brown** bir şeyi yaxşı-yaxşı qızartmaq; 18. *d.d.* 1) baxmaq, tamaşa etmək; **to ~ a museum / a picture gallery** muzeyə / şəkil qalereyasına baxmaq; 2) gəzmək, gəzib baxmaq; *You can't do Moscow in a day Moskvanı bir günə gəzmək olmaz;* 19. getmək *(müəyyən məsafəni); I can do the distance in an hour Mən bu məsafəni bir saata gedə bilərəm; The car was doing 80 miles in an hour Maşın saatda 80 mil sürətilə gedirdi;* 20. çəkmək *(cəza və s.); He is doing 3 years term O, 3 illik həbs cəzası çəkir; He did 10 years O, 10 il həbsdə oturdu;* **to ~ / to be ~ing well** *d.d.* işi gətirmək, işləri yaxşı getmək; *He is doing well now* 1) *İndi onun işləri yaxşı gedir;* 2) *O indi yaxşı qazanır; Vines do well on hillsides Üzüm dağ yamacında yaxşı yetişir;* 3) yaxşılaşmaq, özünü yaxşı hiss etmək; inkişaf etmək; *The patient is doing well now Xəstə indi yaxşılaşır / özünü yaxşı hiss edir; Is the baby doing well? Uşaq yaxşı inkişaf edirmi?;* **to be / to have done (with)** *d.d.* qurtarmaq, sona / başa çatdırmaq; *We are done Biz qurtarmışıq; The day is done Gün keçdi / qurtardı; That's all over and done with Bununla hər şey qurtardı; Have done (with) crying Ağlamağı qurtar / qurtarın!; Be done! Have done! Bəsdir! Qurtar!;* **to have done (with) smb.** bir kəslə haqq-hesabı çürütmək, bir kəsə qalib gəlmək; *I haven't done with him yet Mən hələ onunla haqq-hesabı çürütməmişəm;* **to ~ away with smb. / smth.** bir kəsdən / şeydən can qurtarmaq; **to ~ away with smth.** bir şeyi ləğv / məhv etmək; *The old museum was done away with Köhnə muzey məhv / ləğv edildi;* **to ~ (a text, etc) into another language** başqa dilə tərcümə etmək *(mətni və s.);* **to ~ an article into English** məqaləni ingilis dilinə tərcümə etmək; **to ~ a battle** vuruşmaq, döyüşmək, çarpışmaq; **to ~ a beer** bir parç / krujka pivə içmək

**do[3]** [du:] *v* köməkçi *fel:* **1.** *İndiki və keçmiş zamanların qeyri-müəyyən formalarında felin sual və inkar formalarını düzəltmək üçün işlədilir; Do you speak English? Sən/Siz ingiliscə danışırsanmı/danışırsınızmı? Does she go to school? O, məktəbə gedirmi? Did he go to the cinema yesterday? Dünən o, kinoya getdimi?; I do not know English Mən ingiliscə bilmirəm; She did not come O, gəlmədi;* **2.** *Felin əmr formasının*



*inkar şəklini düzəltmək üçün işlədilir; Do not (Don't) speak! Danışma! / Danışmayın!; Do not be (don't) be afraid! Qorxma / Qorxmayın!*

**do[4]** [du:] *part. Əsas felin mənasını qüvvətləndirmək üçün işlədilir: Bu halda o, Azərbaycan türkcəsinə 1) müxtəlif sözlər (əlbəttə, şübhəsiz və s. i.) vasitəsilə tərcümə edilir: I do believe you! Mən əlbəttə sənə / sizə inanıram; I do think you ought to visit your mother Şübhəsiz fikirləşirəm ki, sən / siz anana / ananıza baş çəkməlisən / çəkməlisiniz; 2) Bəzən isə tərcümə edilmir: Do love me! Məni sev / sevin! Bu halların hamısında* **to do** *feli qüvvətli vurğuya malik olur*

**docile** ['dousaıl] *adj* **1.** itaətli, itaətkar, dinc, müti, sakit, sözəbaxan, sözəqulaqasan, üzüyola; **a ~ child** sözəbaxan/üzüyola uşaq; **a ~ horse** itaətkar / sözəbaxan at; **a ~ personality** sözəqulaqasan/üzüyola/dinc şəxs; **2.** zehinli, dərrakəli, anlaqlı, fərasətli

**docilely** ['dousaıllı] *adv* itaətkarlıqla, itaətlə, itaətkarcasına, acizanə, itaətkar bir tərzdə / surətdə

**docility** [dou'sılıtı] *n* itaət, itaətkarlıq, boyun əymə, sözə baxma; tabelilik

**dock[1]** [dɔk] *n* **I 1.** dok *(gəmilərin təmir olunduğu tərsanə);* **dry ~** quruda olan dok; **graving ~** təmir doku; **floating ~** üzən dok; **to put in ~** doka qoymaq; **to lie in ~** dokda dayanmaq; **2.** gəmi təmiri zavodu *(həm də* **naval ~***);* **3.** *d.y.* tupik; **4.** *amer.* körpü *(gəmilərin yan alması üçün)*

**dock** [dɔk] *n* **II** müttəhimlərin skamyası; **to appear in the ~, to be placed into the ~, to be put into the ~** müttəhim kimi məhkəməyə cəlb edilmək, məhkəmə olunmaq

**dock** [dɔk] *n* **III 1.** *anat.* büzdüm, irtmək; **2.** kəsilmiş quyruq *(heyvanlarda);* **3.** quşqun; quyruqaltı *(qoşquda)*

**dock** [dɔk] *n* **IV** *bot.* turşəng, quzuqulağı

**dock[2]** [dɔk] *v* **I 1.** doka gətirmək *(gəmini);* doka daxil olmaq; **2.** dokda təmir etmək *(gəmini);* **3.** birləşdirmək *(kosmik gəmiləri)*

**dock** [dɔk] *v* **II 1.** kəsmək *(quyruğu);* gödək qırxmaq / kəsmək *(saçı);* **2.** kəsmək, azaltmaq *(xərci, əmək haqqını və s.);* gödəltmək; **to ~ smb.'s wages** bir kəsin əmək haqqını kəsmək/azaltmaq; **to ~ one's life** (öz) ömrünü azaltmaq/gödəltmək

**docker** ['dɔkəʳ] *n* doker, dok fəhləsi

**docket[1]** ['dɔkıt] *n* **1.** yarlıq *(malların üstünə yapışdırılan və onların adını, növünü, cinsini, qiymətini və s. göstərən kağız; etiket);* **2.** gömrük rüsumunun ödənilməsi haqda qəbz

**docket[2]** ['dɔkıt] *v* markalamaq, etiket/yarlıq yapışdırmaq; **to ~ goods** malları markalamaq, malların üstünə etiket/yarlıq yapışdırmaq

**dockland** ['dɔklænd] *n* doka yaxın olan rayon / bölgə

**dockyard** ['dɔkja:d] *n* verf, tərsanə *(gəmi qayrılan və təmir edilən yer)*

**doctor[1]** ['dɔktəʳ] *n* **1.** doktor, həkim; **to see a ~** həkimə getmək; *You'd better see a doctor Yaxşı olar ki, sən/siz həkimə gedəsən / gedəsiniz;* **to send for a ~** həkim dalınca göndərmək, həkim çağırmaq; **2.** ara həkimi, türkəçarəçi; **3.** doktor *(elmi ad);* **D. of Philosophy / Philology, etc.** fəlsəfə/filologiya və s. elmləri doktoru; **to take one's ~'s degree** doktorluq dərəcəsi almaq

**doctor[2]** ['dɔktəʳ] *v* **1.** saxtalaşdırmaq; **to ~ accounts / election returns** hesabatı/seçkinin nəticələrini saxtalaşdırmaq; **2.** qatmaq, qarışdırmaq; **to ~ beer with water** pivəyə su qatmaq; *They doctored the girl's fruit juice with vodka and she got very drunk Onlar qızın (içdiyi) meyvə şirəsinə araq qatdılar və o, bərk sərxoş oldu / kefləndi;* **3.** tələsik təmir etmək, qaydaya salmaq *(arabanı, maşını);* **to ~ a cart** arabanı tələsik təmir etmək; **4.** *d.d.* müalicə etmək; **to ~ smb. for rheumatism** bir kəsi revmatizmdən müalicə etmək; **5.** müalicə olunmaq; dərman qəbul etmək; **6.** axtalamaq *(xüs. heyvanı); The goat's been doctored Keçi axtalanıb;* **7.** doktorluq dərəcəsi vermək

**doctoral** ['dɔktərəl] *adj* doktor, doktorluq; **a ~ thesis / dissertation** doktorluq dissertasiyası; **a ~ degree** doktor/doktorluq dərəcəsi; **a ~ student / candidate** *amer.* doktorant

**doctorate[1]** ['dɔktərıt] *n* doktor / doktorluq dərəcəsi

**doctorate[2]** ['dɔktəreıt] *v* doktor / doktorluq dərəcəsi vermək

**doctoress** ['dɔktərıs] *n* = **doctress**

**doctorial** [dɔk'tɔ:rıəl] *adj* = **doctoral**

**doctorship** ['dɔktəʃıp] *n* doktorluq; doktorluq vəziyyəti və funksiyası *(elmi)*

**doctress** ['dɔktrıs] *n* qadın həkim

**doctrinaire[1]** [ˌdɔktrı'neə] *n* doktrinyor; nəzəriyyəbaz, cahil adam *(öz yanlış fikrini inadla və kor-koranə müdafiə edən adam);* sxolast, sxolastik *(sxolastik düşünən adam, əzbərçi)*

**doctrinaire[2]** [ˌdɔktrı'neə] *adj* sxolastik, əzbərçi, doktrinyor; **a ~ Marxist** sxolastik/əzbərçi Marksist; **~ attitudes / beliefs /policy** sxolastik münasibət/inam/ siyasət

**doctrinal** [dɔk'traınəl] *adj* nəzəri, doktrinaya aid olan; **a rigidly ~ approach** ciddi nəzəri yanaşma

**doctrine** ['dɔktrın] *n* **1.** doktrina *(elmi, fəlsəfi və ya siyasi nəzəriyyə),* nəzəriyyə, təlim; **the ~ of the atom/of relativity** atom / nisbilik nəzəriyyəsi; **2.** doqma, ehkam; **Catholic ~s** katolik doqmalar / ehkamlar; *Progress has swept many of the old doctrines away İnkişaf köhnə ehkamların çoxunu süpürüb kənara atıb*

**document[1]** ['dɔkjumənt] *n* sənəd; arayış; **confidential ~** gizli sənəd; **official ~s** rəsmi sənədlər; *Let me see all the official documents concerning the sale of this land İcazə ver/verin, bu torpağın satılmasına aid olan bütün rəsmi sənədlərə baxım*

**document²** ['dɔkjumənt] *v* **1.** sənədləşdirmək; **to ~ a sale** satışı sənədləşdirmək; **2.** əsaslandırmaq; **to ~ *one's* claim** öz iddiasını əsaslandırmaq; *That's a very interesting claim, but can you document it? Bu çox maraqlı iddiadır, lakin sən / siz onu əsaslandıra bilərsənmi / bilərsinizmi?*

**documental** [,dɔkju'mentl] *adj* = **documentary**

**documentary¹** [,dɔkju'mentərı] *n* sənədli film, sənədli / sənədlər əsasında yazılmış povest / roman / oçerk

**documentary²** [,dɔkju'mentərı] *adj* **1.** sənədli; **~ film** sənədli film; **~ proof** sənədli sübut; **~ films showing the lives of working people** zəhmətkeşlərin həyatını göstərən sənədli filmlər; **2.** sənədlə sübut edilən / əsaslandırılan; **3.** öyrədici

**documentation** [,dɔkjumen'teıʃn] *n* **1.** sənədləşdirmə, sənədləşmə; sənədlərlə əsaslandırma; **~ of a claim / of an agreement, *etc.*** iddianı / müqaviləni və s. sənədləşdirmə/ sənədlərlə əsaslandırma; **2.** *top.i* sənədlər; **proper ~** lazımi sənədlər; *I couldn't enter the country because I didn't have the proper documentation Mən ölkəyə daxil ola bilmədim, çünki mənim lazımi sənədlərim yox idi*

**dodder** ['dɔdəʳ] *v* **1.** əsmək, titrəmək *(xüs. qocalıqdan); Poor old Aunt Mary is beginning to dodder Yazıq qoca Meri xala əsməyə başlayır;* **2.** əsə-əsə getmək / gəzmək *(xüs. qocalıqdan); An old man doddered down the street Bir qoca kişi əsə-əsə küçəaşağı getdi;* **3.** mızıldamaq, çeynəyə-çeynəyə/uzada-uzada danışmaq

**doddering** ['dɔdərıŋ] *adj* = **doddery**

**doddery** ['dɔdərı] *adj* zəif, əsən, titrəyən *(xüs. qocalıqdan);* **a group of ~ old men** bir qrup zəif qoca kişi; **a low ~ voice** alçaq titrək səs; *He spoke in a low doddery voice O, alçaq titrək səslə danışdı*

**doddle** ['dɔdl] *n* çox asan yerinə yetirilə bilən iş / tapşırıq

**dodge¹** [dɔdʒ] *n* **1.** aldatma, aldanma, yalan, hiylə, kələk, fırıldaq, biclik, fənd; **calculated ~** qəsdən/qərəzlə aldatma; **to be on the ~** kələk/fırıldaq gəlmək, hiylə etmək, hiyləgərlik/biclik/kələkbazlıq etmək; **2.** *id.* fint *(rəqibi yayındırmaq üçün edilən hərəkət);* **3.** *d.d.* bic zarafat/qurğu; **~ for catching birds** quşu tutmaq üçün tələ

**dodge²** [dɔdʒ] *v* **1.** qorunmaq, çəkinmək, özünü kənara çəkmək; yana çəkilmək *(zərbə zamanı);* **to ~ a blow** zərbədən yayınmaq / qaçmaq; **to ~ *one's* opponent** *id.* rəqibini aldatmaq, rəqibinə kələk gəlmək; **2.** yayınmaq, boyun qaçırmaq; **to ~ a question** sualdan yayınmaq; **to ~ a problem** problemdən / problemin həll edilməsindən boyun qaçırmaq; **to ~ military service** hərbi xidmətdən yayınmaq; **to ~ paying *one's* tax** vergini verməkdən yayınmaq/boyun qaçırmaq; **3.** kələk/fırıldaq gəlmək, biclik / hiyləgərlik / kələkbazlıq etmək; **4.** irəli-geri hərəkət / var-gəl etmək; vurnuxmaq, gedib-gəlmək; **5.** gizlənmək, daldalanmaq; **to ~ behind a tree** ağacın dalında gizlənmək

**dodger** ['dɔdʒəʳ] *n* cəld/çevik/diribaş/zirək adam; hiyləgər / bic / kələkbaz / fəndgir / cüvəllağı *(adam)*

**dodgery** ['dɔdʒərı] *n* fırıldaq, hiyləgərlik, adam aldatma, dələduzluq, kələk / hiylə gəlmə, fırıldaq işlətmə, dələduzluq etmə

**dodgy** ['dɔdʒı] *adj* **1.** diribaş, cəld, zirək, çevik, fəndgir, bacarıqlı, fərasətli; mahir; **2.** şərəfsiz, namussuz; **3.** *d.d.* bic, hazırcavab

**dodo** ['doudou] *n* *(pl* **-es, -os** [-ouz]) **1.** hazırda yaşamayan uça bilməyən iri quş; **2.** gic, axmaq, küt, korazehin, kütbeyin *(adam)*

**doer** ['du:əʳ] *n* **1.** yaradan, icraçı; yaradıcı; iş görən; *We need fewer organizers and more doers Bizə daha az təşkilatçılar və daha çox iş görənlər lazımdır;* **2.** *d.d.* fırıldaqçı, dələduz, yalançı

**does** [dʌz] *(tam forması)*, [dəz, dz] **to do** felinin *reduksiya olunmuş 3-cü şəxs tək forması*

**doesn't** [dʌznt] *d.d.* **does not**-*un qısa forması*

**doff** [dɔf] *v* **1.** soyunmaq, soyunub kənara atmaq *(paltarı);* **2.** papağını çıxartmaq *(salam əlaməti olaraq)*

**dog¹** [dɔg] *n* **1.** it, köpək; **to take the ~ for a walk** iti gəzintiyə çıxarmaq; **a pack of ~s** it / köpək sürüsü; **2.** erkək *(qurd, ayı, tülkü, çaqqal);* **3.** yaramaz, alçaq, əclaf, namərd; **lazy ~** tənbəl, yaramaz; **4.** aşağı keyfiyyətli şey; zibil; *Her last film was an absolute dog Onun son filmi lap zibil idi;* ◊ **hot ~** *amer.* isti sosiskadan hazırlanmış buterbrod; **a ~'s life** it günü, it kimi yaşama; **to lead a ~'s life** it kimi yaşamaq / həyat sürmək; **to die a ~'s death** it kimi gəbərmək; *Every dog has his day at. söz. ≅ Hər aşiqin bir dövranı olur; Love me, love my dog at. söz. Məni sevirsən, itimi də sev; Whose dog is dead? Nə olub? Nə baş verib?; A barking dog doesn't bite Hürən it dişləməz / tutmaz*

**dog²** [dɔg] *v* (**-gg-**) **1.** bir kəsi aramsız olaraq izləmək, bir kəsin arxasınca düşmək; **to ~ *smb.* / *smb.'s* footsteps** bir kəslə dabanbasma getmək, bir kəsi izləmək/təqib etmək; **2.** əl çəkməmək; sakitlik verməmək, sakit buraxmamaq; *He is dogged by misfortune Bədbəxtlik onu izləyir;* **3.** iti qısqırtmaq, üstünə it buraxmaq

**dog-collar** ['dɔg,kɔləʳ] *n* it xaltası

**dog-days** ['dɔgdeız] *n* **1.** yayın ən isti günləri *(iyul və avqust aylarında);* **2.** qara günlər, ağır vaxtlar

**dog-fancier** ['dɔg,fænsıəʳ] *n* **1.** itçi, itçilik mütəxəssisi; **2.** it həvəskarı, itsevər

**dog-fight** ['dɔgfaıt] *n* **1.** *hərb. d.d.* hava vuruşması; **2.** əlbəyaxa vuruş / döyüş; **3.** it boğuşdurulması

**dog-fox** ['dɔgfɔks] *n* dişi / qancıq tülkü



**dogged** ['dɔgıd] *adj* **1.** tərs, inad, inadcıl, inadkar, kəc; **2.** qəti, sarsılmaz, əzmkar; **~ resolution** sarsılmaz/möhkəm qətiyyət; *She was not very clever, but by dogged effort she learnt a good deal at school O, çox da ağıllı deyildi, lakin inadkar səyi ilə məktəbdə çox şey öyrəndi*

**doggedly** ['dɔgıdlı] *adv* tərsliklə, inadla, tərs-tərs

**doggedness** ['dɔgıdnıs] *n* inad, səbat, mətanət, tərslik, inadcıllıq, inadkarlıq, kəclik

**doggerel¹** ['dɔgərəl] *n* heca vəznində yazılmış qədim rus şeri; pis şerlər

**doggerel²** ['dɔgərəl] *adj* pis, yaman, murdar, iyrənc, yaramaz; yöndəmsiz, biçimsiz, əndazəsiz, mənasız *(şer haq.)*

**doggery** ['dɔgərı] *n* **1.** *top. i* itlər; **2.** heyvani davranış; it xasiyyəti/xisləti

**dogginess** ['dɔgınıs] *n* **1.** itə məhəbbət, itə qarşı sevgi; **2.** it / köpək iyi

**doggish** ['dɔgıʃ] *adj* it, ittəhər, itə /köpəyə xas olan; **~ bark** it hürməsi

**doggy¹** ['dɔgı] *n* balaca it; küçük *(uşaqlara deyilir)*

**doggy²** ['dɔgı] *adj* **1.** it, köpək, itə/köpəyə məxsus; **a ~ smell** it/köpək iyi; **2.** itsevən, itxoşlayan

**doghouse** ['dɔghaus] *n* it damı

**dogma** ['dɔgmə] *n (pl həm də* **-ta**) **1.** doqma, ehkam; **political / social/economic ~** siyasi / ictimai / iqtisadi ehkam; **2.** *kils.* ehkam; **3.** inam, etiqad

**dogmata** ['dɔgmətə] *n* **dogma** *isminin cəm forması*

**dogmatic** [dɔg'mætık] *adj* **1.** doqmatik; **~ philosophy** doqmatik fəlsəfə; **a ~ attitude/approach /view** doqmatik münasibət / yanaşma / baxış; *You can't be dogmatic in matters of taste Zövq məsələsində doqmatik olmaq mümkün deyil;* **2.** şərtsiz, qəti, danışıqsız, sözsüz; **a ~ statement** şərtsiz / qəti bəyanat

**dogmatically** [dɔg'mætıkəlı] *adv* doqmatik olaraq; şərtsiz / qəti/danışıqsız olaraq; **to state *smth.* ~** bir şeyi qəti olaraq elan etmək / demək

**dogmatics** [dɔg'mætıks] *n* doqmatika, ehkam

**dogmatism** [dɔg'mætızm] *n* **1.** doqmatizm; **religious ~** dini doqmatizm; **2.** doqmatiklik, qətilik, heç bir etiraza yol verməmə

**dogmatist** [dɔg'mætıst] *n* doqmatik *(doqmatizm tərəfdarı)*, ehkamçı

**dog-rose** ['dɔgrouz] *n* *bot.* itburnu

**dog show** [dɔgʃou] *n* it sərgisi

**dog-tired** ['dɔg'taıəd] *adj* yorulub əldən düşmüş, bərk/it kimi yorulmuş

**dogwood** ['dɔgwud] *n* **1.** *bot.* zoğal; **2.** zoğal ağacı / oduncağı

**doily** ['dɔılı] *n* salfet, xörək dəsmalı, əlsilən *(kağızdan və ya parçadan hazırlanan)*

**doing** ['du:ıŋ] *n* **1.** iş, iş-güc; iş görmə, əməl etmə; qayırma, düzəltmə; *Talking is one thing, doing is another Danışmaq bir şeydir, iş görmək başqa şey; This is their doing Bu onların işidir/əməlidir; This is none of my doing Bu qətiyyən mənim işim deyil; Bunu mən etməmişəm; Tell me about all your doings Bütün işlərin / əməllərin haqqında mənə danış / danışın; He was convinced that the whole problem was my doing O, əmin idi ki, problem bütünlüklə mənim işimdir/əməlimdir;* **2.** hadisə; **great ~s in Africa** Afrikada böyük hadisələr; **3.** səs, səs-küy, qalmaqal; hay-haray; *There have been great doings at their house Onların evində böyük bir hay-haray/səs-küy vardı*

**doldrums** ['dɔldrəmz] *n* **1.** (**the ~**) pis əhval-ruhiyyə, kefsizlik, depressiya, ruh düşkünlüyü; **to be in the ~** ürəyi sıxılmaq, xiffət etmək, qüssələnmək; *He's been in the doldrums ever since his wife left him Arvadı onu atıb gedəndən bəri o, xiffət çəkir;* **2.** *dən.* ekvatorun tam sakit hava (küləksiz) olan sahəsi

**dole¹** [doul] *n* I **1.** işsizliyə görə verilən müavinət / maddi yardım; **to be on the ~** müavinət/ maddi yardım almaq; **to go on the ~** müavinətlə yaşamaq; **2.** paylama, vermə *(xüs. ianə məqsədilə);* **3.** *arx.* tale, pay, qismət, bəxt

**dole** [doul] *n* II **1.** *şair.* qəm, kədər, qüssə, dərd; **2.** ah-zar, ah-uf, inilti, inildəmə; **to make ~** ah-zar / ah-uf etmək, inildəmək

**dole²** [doul] *v* **1.** həvəssiz paylamaq/vermək; qənaətlə vermək/paylamaq; **2.** xeyriyyəçilik etmək, ianə vermək / paylamaq

**doleful** [doulful] *adj* qəmli, qüssəli, kədərli, dərdli; **a ~ face** qəmli / qüssəli / kədərli sifət

**dolefully** ['doulfulı] *adv* qəmli-qəmli, kədərli-kədərli, qüssəli-qüssəli

**dolefulness** ['doulfulnıs] *n* qəmlilik, kədərlilik, qüssəlilik

**dolesome** ['doulsəm] *adj* = **doleful**

**doll¹** [dɔl] *n* **1.** kukla, gəlincik *(oyuncaq);* müqəvva; **2.** qəşəng uşaq; **3.** *amer. d.d.* qız, qadın; **4.** aşna, məşuqə

**doll²** [dɔl] *v* **1.** bəzənmək, bəzənib-düzənmək; **2.** bəzəndirmək, bəzəndirib-düzəndirmək

**dollar** ['dɔləʳ] *n* dollar; **five ~s** beş dollar; **to pay in ~s** dollarla ödəmək; *I have ten dollars in my pocket Mənim cibimdə on dollar var;* **the ~s** var, var-dövlət, zənginlik, pul; **the ~** ABŞ dollarının dəyəri/ qiyməti; *The dollar closed two cents down Dolların qiyməti iki sent aşağı düşdü*

**dollish** ['dɔlıʃ] *adj* kukla kimi, kuklaya bənzər / oxşar

**dolphin** ['dɔlfın] *n* *zool.* delfin

**dolt** [doult] *n* axmaq, səfeh, sarsaq, gic, korazehin, qanmaz *(adam)*

**doltish** ['doultıʃ] *adj* gicbəsər, gictəhər, ağıldan kəm, ağlı çatmayan, kütbeyin

**doltishness** ['doultıʃnıs] *n* gicbəsərlik, gictəhər-

lik, səfehlik, sarsaqlıq, ağıldan kəmlik, ağlı çatmama, kütbeyinlik

**-dom** [-dəm] *suff Sifətdən düzəldilmiş mücərrəd isimlərdə təsadüf edilir və aşağıdakı mənaları ifadə edir:* 1. *Hal, vəziyyət bildirir:* free**dom** azadlıq; bore**dom** sıxıntı; 2. *titul bildirir:* earl**dom** qraf titulu, duke**dom** hersoq titulu; 3. *Hökmdarlığın əhatə etdiyi sahəni, təlim əhatəsini və s.:* king**dom** krallıq, Christen**dom** xristianlıq aləmi/dünyası; 4. *Eyni sənətə qulluq edən insan qrupunu:* teacher**dom** müəllimlik; official**dom** məmurluq

**domain** [də'meɪn] *n* 1. mülk, malikanə; ərazi; ağalıq/bəylik yeri; 2. elm/fəaliyyət sahəsi; **in the ~ of science/literature** elm /ədəbiyyat sahəsində; *I can't answer your question about botany. It's not in my domain Mən botanika haqqında sənin / sizin sualına/sualınıza cavab verə bilmərəm. O mənim sahəm deyil*

**dome**[1] [doum] *n* 1. günbəz, qübbə; **the ~ of a church** kilsənin günbəzi; 2. əzəmətli bina; 3. rəsədxana qübbəsi

**dome**[2] [doum] *v* 1. günbəz/qübbə qoymaq; 2. günbəz / qübbə forması vermək

**domed** [doumd] *adj* 1. günbəzli, qübbəli; 2. günbəzşəkilli, günbəzvarı, günbəzformalı; qabarıq; **a ~ forehead** qabarıq alın; 3. çəlləkvarı, çəlləyəoxşar

**domestic**[1] [də'mestɪk] *n* 1. qulluqçu, ev qulluqçusu *(qız, qadın)*, nökər; 2. ölkənin daxilində istehsal olunan mallar, yerli mallar

**domestic**[2] [də'mestɪk] *adj* 1. ailə, ev; **~ trouble** ailə əzabı/qalmaqalı; **~ servant** ev qulluqçusu /qarabaşı; **~ cares** ailə dərd-səri / qayğıları; **~ science** evdarlıq / ev işləri haqqında elm; **~ water/gas/electricity supplies** evin su / qaz / elektriklə təmin olunması / təminatı; **~ comforts** ev rahatlığı; 2. daxili, ölkədaxili; **~ loan / trade** daxili istiqraz / ticarət; **~ policy** daxili siyasət; **intervention in the ~ affairs of a country** ölkənin daxili işlərinə qarışma; 3. yerli; **~ wine** yerli *(yəni ölkənin özündə istehsal edilən)* şərab / çaxır; **~ goods** yerli mallar; 4. ev, ələ öyrədilmiş, əhliləşdirilmiş; **~ animals** ev heyvanları; *Horse, cow, goat, sheep are domestic animals At, inək, keçi, qoyun ev heyvanlarıdır;* 5. evcanlı, evini sevən, evcil, ailəcanlı, ailəsevər; **~ man** ailəcanlı kişi; **~ woman** evcanlı / evcil / ailəsevər / ailəcanlı qadın

**domesticate** [də'mestɪkeɪt] *v* 1. evə məhəbbəti artırmaq, evə məhəbbət yaratmaq; 2. ev təsərrüfatını idarə etməyi öyrətmək; 3. əhliləşdirmək, ələ öyrətmək *(heyvanı)*; 4. mədəniləşdirmək, mədəni etmək; 5. qəbul etmək; mənimsəmək, götürmək; əxz etmək; **to ~ a custom** adəti qəbul etmək; **to ~ a foreign word** xarici/əcnəbi sözdən istifadə etmək

**domesticated** [də'mestɪkeɪtɪd] *adj* əhliləşdirilmiş, ələ öyrədilmiş; **~ animals** əhliləşdirilmiş heyvanlar

**domestication** [də,mestɪ'keɪʃn] *n* əhliləşdirmə, öyrətmə, öyrədilmə *(heyvanı)*

**domesticity** [,doumes'tɪsɪtɪ] *n* 1. ev / ailə həyatı; 2. evə / ailəyə bağlılıq; evdarlıq, ev işləri; 3. ailəsini / ailə həyatını sevmə; evcanlılıq; qohumbazlıq, ailəpərəstlik

**domicile**[1] ['dɔmɪsaɪl] *n* daimi yaşayış yeri

**domicile**[2] ['dɔmɪsaɪl] *v* daimi yaşayış yerinə köçürmək

**dominant**[1] ['dɔmɪnənt] *n* 1. dominant *(əsas əlamət)*; 2. *mus.* dominant *(diatonik qammanın beşinci pilləsi)*

**dominant**[2] [dɔmɪnənt] *adj* əsas, başlıca, aparıcı, hakim, hökmran; **~ idea** əsas/başlıca ideya; **~ position** başlıca vəziyyət; **~ party** hökmran partiya; **~ character** əsas / aparıcı xüsusiyyət

**dominate** ['dɔmɪneɪt] *v* 1. ağalıq / hökmranlıq etmək; üstün olmaq; **to ~ *(over)* people** adamlar üzərində ağalıq etmək, adamları özünə tabe etmək; *He has authority, but he doesn't try to dominate O, ixtiyar sahibidir, lakin ağalıq etməyə cəhd göstərmir;* 2. saxlamaq, cilovlamaq, ələ almaq; **to ~ *one's* emotions** öz hisslərini cilovlamaq; 3. yüksəlmək, ucalmaq, qalxmaq; 4. üstünlük təşkil etmək, əsas yer tutmaq; *The election dominated TV news coverage for a month Seçki televiziya xəbərlərində bir ay əsas yer tutdu*

**dominative** ['dɔmɪnətɪv] *adj* 1. rəhbərlik / hökmdarlıq edən; 2. hökmlü, hökmü / ixtiyarı çatan; səlahiyyətli, səlahiyyəti / ixtiyarı olan

**dominator** ['dɔmɪneɪtəʳ] *n* hökmdar, hakim; idarə edən; başçı

**domineer** [,dɔmɪ'nɪəʳ] *v* 1. **(over)** tiranlıq etmək, tiran kimi idarə etmək, təkbaşına rəhbərlik / idarə etmək; 2. **(over, above)** üstün/hakim olmaq *(bir yerdə)*

**domineering** [,dɔmɪ'nɪərɪŋ] *adj* zalım, müstəbid, qəddar; hökmlü; amiranə; **a ~ husband** zalım / müstəbid / qəddar ər; **a ~ person** zalım / müstəbid / qəddar şəxs; **a ~ manner** amiranə davranış

**dominion** [də'mɪnɪən] *n* 1. dominion *(bir ölkənin hakimiyyəti altında olan ərazi / ölkə)*; **the vast ~s of the Chinese Empire** Çin İmperiyasının geniş dominionları; 2. hakimiyyət, hökmranlıq, hakimiyyət hüququ; müstəqillik, müstəqil hakimiyyət; **under the ~ of *smth.*** bir şeyin hakimiyyəti altında; **to hold ~ *(over)*** hökmranlıq etmək; *Alexander the Great held dominion over a large area Böyük İsgəndər geniş bir ərazidə hökmranlıq edirdi; Man's dominion over the rest of creation is almost complete Demək olar ki, insan digər varlıqlar üzərində tam hakimdir*

**domino** ['dɔmɪnou] *n* I *(pl* **-oes** [-ouz]) domino *(oyun və oyun daşları)*

**domino** ['dɔmɪnou] *n* II *(pl* **-oes** [-ouz]) domino *(1) masqarad paltarı; 2) domino geymiş masqarad iştirakçısı)*

**don** [dɔn] *n* 1. universitet müəllimi *(xüs. Oksford və ya Kembric universitetlərində)*; 2. ispan dilində kişi adlarının qarşısında işlədilən titul *(bu halda böyük hərflə yazılır: Don Ramon)*

**donate** [dou'neɪt] *v* hədiyyə/bəxşiş vermək, bağışlamaq

**donation** [dou'neɪʃn] *n* 1. hədiyyə / bəxşiş vermə; 2. hədiyyə, ianə, ianə vermə; bağışlama; **large ~s** böyük ianələr; **to make a ~ of *smth.* to *smb.*** bir şeyi bir kəsə bəxşiş olaraq vermək; 3. *hüq.* verilmiş bəxşiş / hədiyyə haqqında sənəd

**donative** ['dounətɪv] *adj* bağışlanmış, hədiyyə edilmiş, ianə olaraq verilmiş

**donator** [dou'neɪtəʳ] *n* hədiyyə / bəxşiş verən; ianəçi, ianə verən

**donatory** ['dounətərɪ] *n* hədiyyə / bəxşiş alan şəxs, ianə verilən / alan adam

**done**[1] [dʌn] **to do** *felinin pp forması*

**done**[2] [dʌn] *adj* 1. yaxşı bişmiş *(yemək haq.)*; *The meat isn't quite done yet Ət hələ yaxşı bişməyib;* 2. ictimaiyyət tərəfindən qəbul edilən; *Smoking isn't done Papiros çəkmək yaramaz;* 3. **(with)** qurtarmaq; *Let's get the washing-up done with and then we can relax Gəl / Gəlin yumaq işini qurtaraq, sonra dincələ bilərik; When the police were done with him, he was free to go home Polis onunla işini qurtardıqdan sonra, onu azad etdi; When he pointed the gun at me, I thought I was done O, tüfəngi mənə tuşlayanda, fikirləşdim ki, işim bitdi;*

◊ *What's done cannot be undone at. söz.* ≅ *Keçənə güzəşt deyərlər*

**donkey** ['dɔŋkɪ] *n* 1. *zool.* eşşək; 2. eşşək, heyvan *(söyüş)*;

◊ **~'s years** uzun vaxt / müddət; *It's donkey's years since we've seen each other Biz bir-birimizi xeyli vaxtdır / müddətdir ki, görmürük; That was a donkey's years ago Bu çox-çox bundan qabaq olub*

**donor** ['dounəʳ] *n* 1. hədiyyə/bəxşiş verən, ianəçi, ianə verən; 2. *tib.* donor

**do-nothing**[1] ['du:,nʌθɪŋ] *n* tənbəl, veyl, avara *(adam)*

**do-nothing**[2] ['du:,nʌθɪŋ] *adj* tənbəl, avara, veyl

**don't** [dount] *d.d.* **do not**-*un qısa forması*

**doodle**[1] ['du:dl] *n d.d.* 1. gic, axmaq, avara, səfeh *(adam)*; 2. kiçik xətt, əyri-üyrü yazı /xətt *(fikirli və ya narahat olarkən adamların boş-boşuna kağız üzərinə çəkdiyi cürbəcür mənasız xətlər, fiqurlar)*

**doodle**[2] ['du:dl] *v* fikirli və ya narahat olan məqamda mənasız şəkillər, xətlər, formalar çəkmək, cızma-qara etmək

**doom**[1] [du:m] *n* 1. tale, qismət, qəzavü-qədər, alın yazısı; 2. axirət; məhv olma, ölüm; **to go to *one's* ~** açıq-açığına ölümə getmək; 3. *din.* məhşər, qiyamət; **the day of ~** məhşər / qiyamət günü

**doom**[2] [du:m] *v (adətən məchul növdə işlədilir)* 1. məhkum / düçar etmək; pisləmək, məzəmmət etmək, məzəmmətləmək, qınamaq, pisləmək; **to be ~ed to failure** uğursuzluğa məhkum olmaq; *The plan was doomed to failure from the start Plan lap əvvəldən uğursuzluğa məhkum olmuşdu;* **to be ~ed to die** ölümə məhkum olmaq; *Nowadays some animals, birds, even plants are doomed to die Hazırda bəzi heyvanlar, quşlar, hətta bitkilər ölümə/məhv olmağa məhkumdur;* 2. *hüq.* ittiham hökmü çıxarmaq, məhkum etmək, iş kəsmək; **to ~ *smb.* to exile** bir kəsi sürgün etmək haqqında hökm çıxarmaq; **to be ~ed to death** ölümə məhkum edilmək

**doomed** [du:md] *adj* məhkum edilmiş, iş kəsilmiş; **~ to destruction /to death** məhv olmağa / ölümə məhkum edilmiş

**doomsday** ['du:mzdeɪ] *n* 1. *din.* məhşər / qiyamət günü; 2. dünyanın sonu;

◊ **from now till ~** əbədi, həmişəlik, qiyamət / məhşər gününə qədər; **to wait till ~** qiyamətə qədər gözləmək

**door** [dɔ:ʳ] *n* 1. qapı; **front ~** ön qapı; **back ~** arxa / dal qapı; **from ~ to ~** qapı-qapı; **to bang the ~** qapını çırpmaq; **to knock at the ~** qapını döymək/tıqqıldatmaq; **to answer the ~** qapını açmaq; **to shut / to close the ~** qapını bağlamaq / örtmək; **to shut / to close the ~ upon *smb.*** bir kəsin üzünə qapını bağlamaq; **to slam / to shut the ~ in *smb.'s* face** qapını bir kəsin üzünə çırpmaq; **in ~s** içəridə, qapalı yerdə; **out of ~(s)** açıq havada, həyətdə; **next ~** qonşuluqda, yaxınlıqda; **to live next ~ to *smb.*** bir kəslə qapı-qapıya yaşamaq; 2. *məc.* yol; **~ to success** müvəffəqiyyətə yol; **to open the ~ to an agreement** razılığa yol açmaq; **to close the ~ upon an agreement** razılığa gəlmənin yolunu bağlamaq;

◊ **at death's ~** ölümün pəncəsində; **to be at death's ~** can üstündə/ölüm ayağında olmaq; **out of ~(s)** yersiz, yersiz olaraq, münasibətsiz, münasibətsiz olaraq; **behind closed ~s** bağlı qapı arxasında, xəlvəti, gizli; **to turn *smb.* out of ~s** bir kəsi qapıdan qovmaq; **to show the ~ to *smb.*, to show *smb.* the ~** bir kəsə qapını göstərmək, bir kəsi evdən qovmaq; **to lay *smth.* at *smb.'s* ~** günahı bir kəsin boynuna yıxmaq / qoymaq

**door-bell** ['dɔ:bel] *n* qapı zəngi

**door-case** ['dɔ:keɪs] *n* qapı çərçivəsi

**door-frame** ['dɔ:freɪm] *n* = **door-case**

**door-handle** ['dɔ:,hændl] *n* qapı dəstəyi

**door-keeper** ['dɔ:kɪ:pəʳ] *n* qapıçı; dalandar

**door-knob** ['dɔ:nɔb] *n* qapı dəstəyi *(girdə)*

**door-knocker** ['dɔ:,nɔkəʳ] *n* qapı çəkici

**doorman** ['dɔ:mən] *n (pl* **-men** [-mən]) = **door-keeper**

**door-mat** ['dɔ:mæt] *n* 1. ayaqaltı; 2. *məc.* iradəsiz adam
**door-plate** ['dɔ:pleɪt] *n* qapıya vurulan lövhəçik *(ad, soyad və s. yazılan)*
**doorway** ['dɔ:weɪ] *n* qapının girəcəyi; **to stand in the** ~ qapının ağzında/girəcəyində dayanmaq
**dope**[1] [doup] *n* 1. pasta; qatı sürtkü yağı; 2. lak; 3. dopinq; 4. *məc.* narkotik; tiryək; 5. *d.d.* narkoman; 6. gic, sarsaq, axmaq; *You're holding the picture upside down, you dope! Şəkli sən başıaşağı tutursan, ay sarsaq!;* 7. gizli məlumat *(xüs. cıdır atları haq.)*; **inside** ~ qeyri-rəsmi məlumat; **to spill / to hand (out) the** ~ gizli məlumatı danışmaq; 8. *jarq.* yalan məlumat, aldatma, yalan, hiylə, kələk, fırıldaq; *Don't pull / put any of this dope on me Mənim gözümdən pərdə asma / asmayın, Məni aldatma / aldatmayın*
**dope**[2] [doup] *v* 1. pasta/lak sürtmək; laklamaq; 2. durulaşdırmaq; qatmaq *(su və s.)*; qarışdırmaq; saxtalaşdırmaq; 3. narkotik maddə və ya dopinq vermək; **to ~ a horse** ata dopinq vermək; *Test revealed that the winning horse had been doped Test müəyyən etdi ki, qalib gələn ata dopinq verilib;* **to ~ oneself with cocaine** kokain iyləmək; 4. məst / bihuş etmək; *The kidnappers had doped the child and tied him up Uşaq oğruları uşağı məst etdilər və onun əl-ayağını bağladılar*
**dopey** ['doupɪ] *adj* = **dopy**
**dopy** ['doupɪ] *adj* **(dopier, dopiest)** *d.d.* 1. süst, halsız, cansız; yuxulu; məst, bihuş; *I'm feeling really dopy this morning Mən doğrudan da özümü bu səhər halsız hiss edirəm;* 2. *sl.* gic, axmaq, sarsaq, kütbeyin
**dorm** [dɔ:m] *n d.d.* = **dormitory**
**dormant** ['dɔ:mənt] *adj* 1. yatan, mürgüləyən, mürgü döyən; ~ **lion** yatan / mürgüləyən şir; 2. sakit, dinc; 3. fəaliyyət göstərməyən, fəaliyyətsiz, fəaliyyətdə olmayan, qeyri-fəal; gizli; ~ **volcano** sönmüş / fəaliyyətsiz vulkan; ~ **capital** ölü / dövriyyədə olmayan kapital; ~ **passions** gizli ehtiraslar; ~ **partner** işdə fəal iştirak etməyən partnyor /şərik; **to lie** ~ fəaliyyət göstərməmək, hərəkətsiz / boş dayanmaq, işləməmək; *Many plants lie dormant throughout the winter Çox zavodlar bütün qışı fəaliyyət göstərmir / işləmir; The virus can lie dormant for many years Virus bir çox illər fəaliyyətsiz /gizli qala bilər*
**dormitive** ['dɔ:mɪtɪv] *adj* yuxugətirən, yuxuladıcı
**dormitory** ['dɔ:mɪtrɪ] *n* 1. yataq otağı; 2. ümumi yataqxana *(məktəblərdə)*; 3. tələbə yataqxanası
**dormouse** ['dɔ:maus] *n (pl* **dormice** ['dɔ: maɪs]) 1. *zool.* süleysin *(dələyəoxşar heyvan)*; 2. *məc.* yuxucul / yatağan adam
**dorsal**[1] ['dɔ:sl] *n* 1. bel üzgəci *(balıqda)*; 2. *anat.* onurğa fəqərəsi
**dorsal**[2] ['dɔ:sl] *adj* 1. bel; dorsal; **a shark's** ~ **fin** köpək balığının bel üzgəci; ~ **vertebrae** bel fəqərələri; ~ **spinal cord** *anat.* onurğa beynin/ haram iliyin döş hissəsi; ~ **side** *bot.* yuxarı hissəsi *(yarpağın)*; 2. *fon.* dilarxası *(səs haq.)*
**dosage** ['dousɪdʒ] *n* dozalara bölünmə / bölmə, hissələrə bölmə/bölünmə *(dərman haq.)*; doza *(müəyyən miqdar dərman)*; *Do not exceed the recommended dosage Məsləhət görülmüş dozadan artıq içmə / qəbul etmə (dərmanı)*
**dose**[1] [dous] *n* doza *(müəyyən miqdar dərman)*; **daily** ~ gündəlik doza; **maximum** ~ maksimum doza; **permissible** ~ mümkün olan/icazə verilən doza; **to give the correct** ~ düzgün doza vermək; **fatal / lethal** ~ öldürücü doza; **a lethal ~ of radiation** radiasiyanın öldürücü dozası
**dose**[2] [dous] *v* 1. dozalara/hissələrə bölmək; 2. müəyyən dozalarla vermək; dərmanı dozalarla verməklə sağaltmaq *(xəstəni)*; 3. dərman qəbul etmək; *He dosed himself up with aspirin and went to bed O, aspirin qəbul edib yatdı*
**doss**[1] [dɔs] *n jarq.* 1. çarpayı *(yataqxanada)*; 2. yuxu
**doss**[2] [dɔs] *v jarq.* 1. gecələmək *(yataqxanada)*; 2. yatmaq
**dosser** ['dɔsəʳ] *n sl.* evsiz/yataqxanada yaşayan *(adam)*
**doss-house** ['dɔshaus] *n d.d.* yataqxana, yataq evi *(yoxsullar üçün)*
**dossier** ['dɔsɪeɪ] *n fr.* dosye *(bir işə və ya məsələyə aid bütün sənəd və materiallar)*; iş
**dot**[1] [dɔt] *n* I 1. nöqtə; **~s and dashes** nöqtələr və tirelər *(Morze əlifbasında)*; 2. ləkə; *The island was just a dot on the horizon Ada üfüqdə ancaq bir ləkə idi;*
◊ **to a** ~ ən son təfərrüata qədər; **to come on the** ~ düz vaxtında gəlmək; *He's very punctual - He always comes on the dot O, çox dəqiqdir, həmişə düz vaxtında gəlir;* **in the year** ~ çoxdan, uzaq keçmişdə, çox illər bundan əvvəl / qabaq
**dot** [dɔt] *n* II *fr.* cehiz
**dot**[2] [dɔt] *v* **(-tt-)** 1. nöqtə qoymaq; 2. punktirlərlə qeyd etmək; punktirlə xətt çəkmək; 3. örtmək, səpələmək, tökmək; **a field ~ted with flowers** güllərlə örtülü çöl; **to ~ down** qısaca qeydə almaq / yazmaq; **to ~ down a conversation** söhbəti qısaca olaraq qeydə almaq;
◊ **to ~ the i's** tamamlamaq, qurtarmaq, axıra çatdırmaq; **to ~ *one's* i's and to cross *one's* t's** işini tamamlamaq, tapşırığı yerinə yetirmək
**dotage** ['doutɪdʒ] *n* 1. qocalıqdan əmələ gələn ağıl zəifliyi; **to be in *one's* ~** uşaqlaşmaq; 2. pərəstiş etmə, həddindən artıq sevmə, məftunluq; pərəstiş; kor-koranə sevmə / sevgi
**dote** [dout] *v* 1. uşaqlaşmaq, qocalıq ağıl zəifliyindən əziyyət çəkmək; 2. **(on, upon)** dəlicəsinə/dəli kimi sevmək, vurulmaq; *She dotes on her grandchildren O, nəvələrini dəlicəsinə sevir*
**doting** ['doutɪŋ] *adj* dəlicəsinə/çılğınlıqla sevən; məhəbbət bəsləyən; **a ~ husband** çılğıncasına sevən ər; **a ~ son** çılğıncasına sevən oğul



**dotty** ['dɔtɪ] *adj (-ier; -iest)* 1. qəribə; səy, sarsaq, axmaq; *He's getting a bit dotty in his old age Qoca yaşlarında o bir az sarsaqlayır/ səyləyir;* 2. **(about)** çox / bərk sevmək, çox istəmək; *She's dotty about her latest boyfriend O özünün axırıncı sevgilisini çox sevir*
**double**[1] ['dʌbl] *adj* 1. ikiqat; ikili; iki hissədən ibarət; qoşa; ~ **chin / door** ikiqat buxaq / qapı; ~ **window** ikiqat çərçivəsi olan pəncərə; ~ **bed** ikiadamlıq çarpayı; **a gun with a ~ barrel** qoşalülə tüfəng; **a knife with a ~ edge** ikiağızlı bıçaq; **to give a ~ knock at the door** qapını iki dəfə döymək; ~ **image** ikiqat təsvir *(televizorun bir şeyi iki göstərməsi)*; ~ **tooth** azı dişi; ~ **check** *şahm.* ikiqat şah; ~ **time** *hərb.* sürətli marş / qaçış; *Double time! İrəli (komanda);* **to have ~ character** ikili xüsusiyyətə malik olmaq; *The Gerund has double character Cerund ikili xüsusiyyətə malikdir;* 2. iki, iki cür, ikitərəfli; ~ **service** iki cür/ikitərəfli xidmət; ~ **cause** iki səbəb; 3. ikiləşdirilmiş, ikiqat; ~ **blanket** ikiqat yorğan; ~ **coat of paint** ikiqat rəng; ~ **speed** ikiqat sürət; ~ **work** ikiqat iş; *His income is double what it was Onun gəliri olduğundan ikiqat artıqdır;* 4. ikimənalı; **to have a ~ meaning** ikimənalı olmaq; 5. ikiüzlü; riyakar; ~ **conduct** ikiüzlü / riyakar davranış; ~ **game** ikibaşlı oyun; ikiüzlülük, riyakarlıq; **to wear a ~ face** ikiüzlülük / riyakarlıq etmək; 6. *bot.* çoxləçəkli; ~ **flower** çoxləçəkli çiçək/gül
**double**[2] ['dʌbl] *v* 1. ikiqat artırmaq / çoxaltmaq; artırmaq, gücləndirmək; **to ~ *one's* stake** banka atılan pulu ikiqat artırmaq *(qumar oyununda)*; 2. artmaq, çoxalmaq, iki dəfə artmaq / çoxalmaq; *The population has doubled Əhali ikiqat artıb/çoxalıb; Our force doubles that of the enemy Bizim gücümüz düşməninkindən ikiqat çoxdur;* 3. *teatr.* iki rol oynamaq; **to ~ the parts of two characters** iki personajın rolunu oynamaq; 4. əvəz etmək; **to ~ for *smb.*** bir kəsin vəzifəsini yerinə yetirmək; 5. ikiqat bükmək; **to ~ a blanket** yorğanı ikiqat bükmək; 6. əyilmək, bükülmək, qatlanmaq; 7. *hərb.* iri addımlarla irəliləmək / hərəkət etmək; qaçmaq, yüyürmək; **to ~ up** 1) qatlamaq; **to ~ up a sheet of paper** bir vərəq kağızı qatlamaq; 2) qatlanmaq; *The rug won't double up Xalça qatlanmır;* 3) qıvrılmaq, qıc etmək; **to ~ up *one's* body** bədənini qıvrıltmaq; 4) qıvrılmaq, qıc olmaq; **to ~ up with pain** ağrıdan qıvrılmaq/ qovrulmaq /qıc olmaq; 5) birgə yaşamaq, eyni mənzildə / otaqda yaşamaq
**double**[3] ['dʌbl] *adv* 1. ikiqat, iki dəfə, ikiqat çox/artıq; ~ **as bright** ikiqat / iki dəfə parlaq; **to cost ~** ikiqat / iki dəfə baha olmaq; **to bend ~ with pain** ağrıdan ikiqat olmaq; 2. iki-iki, cüt; **to sleep ~** cüt yatmaq, bir yerdə yatmaq *(yəni bir çarpayıda)*; *I had to bend double to get under the table Mən stolun altına girmək üçün əyilməli oldum*
**double-barrelled** ['dʌbl,bærəld] *adj* 1. qoşalülə; ~ **gun** qoşalülə tüfəng; 2. iki məqsəd daşıyan /güdən; 3. ikimənalı, müəmmalı; eyhamlı, kinayəli; ~ **compliment** ikimənalı/eyhamlı kompliment
**double-bass** [,dʌbl'beɪs] *n* kontrabas *(iri skripkaya oxşar musiqi aləti)*
**double-bedded** ['dʌbl,bedɪd] *adj* ikiçarpayılı; iki çarpayısı olan *(mehmanxana otaqları haq.)*
**double-breasted** ['dʌb'brestɪd] *adj* ikiyanlı, iki tərəfdən düymələnən *(paltar)*
**double-cross**[1] ['dʌbl'krɔs] *n d.d.* aldatma, aldanma; hiylə, yalan, kələk, fırıldaq; biclik, tələ
**double-cross**[2] ['dʌbl'krɔs] *v d.d.* aldatmaq, tovlamaq, kələk / fırıldaq / hiylə gəlmək
**double-dealer** ['dʌbl'dɪ:ləʳ] *n* yalançı, adamaldadan; ikiüzlü, riyakar *(adam)*
**double-dealing**[1] ['dʌbl'dɪ:lɪŋ] *n* yalan, hiylə, kələk, fırıldaq; biclik, aldatma, aldanma; ikiüzlülük, riyakarlıq
**double-dealing**[2] ['dʌbl'dɪ:lɪŋ] *adj* ikiüzlü, riyakar
**double-dye** ['dʌbl'daɪ] *v* iki dəfə boyamaq / rəngləmək
**double-dyed** ['dʌbl'daɪd] *adj* iki dəfə boyanmış / rənglənmiş
**double-eagle** ['dʌbl'i:gl] *n* 1. ikibaşlı qartal *(qədim türklərin dövlət rəmzi)*; 2. iyirmi dollar dəyərində qədim amerikan qızıl pulu / sikkəsi
**double-event** ['dʌblɪ'vent] *n id.* ikiməşqli yarış
**double-faced** ['dʌblfeɪst] *adj* 1. ikiüzlü *(parça haq.)*; 2. ikitərəfli; ~ **hammer** ikitərəfli çəkic
**double-first** ['dʌbl'fə:st] *n* 1. iki ixtisas üzrə birinci dərəcəli diplom; 2. iki ixtisas üzrə birinci dərəcəli diplomla universitet qurtarmış *(adam)*
**double-handed** ['dʌbl,hændɪd] *adj* 1. iki əli olan, iki əlli; 2. ikidəstəkli; 3. köməkçi ilə işləyən; 4. ikiüzlü, riyakar; saxta
**double-headed** ['dʌbl,hedɪd] *adj* ikibaşlı; ~ **eagle** ikibaşlı qartal
**double-hearted** ['dʌbl,ha:tɪd] *adj* ikiüzlü, riyakar
**double-minded** ['dʌbl'maɪndɪd] *adj* 1. qərarsız, qətiyyətsiz, mütərəddid; cəsarətsiz, aciz, tərəddüd edən; 2. saxta, ikiüzlü, riyakar
**doubleness** ['dʌblnɪs] *n* 1. ikililik, iki tərəfə meyl edən / göstərən; 2. ikiüzlülük, riyakarlıq
**doublet** ['dʌblɪt] *n* 1. dublikat; surət, kopiya *(sənədin ikinci nüsxəsi)*; 2. qoşa *(zərdə)*
**double-tongued** ['dʌbl'tʌŋd] *adj* ikidilli, yalançı, qeyri-səmimi
**doubling** ['dʌblɪŋ] *n* 1. ikiqat artırma/artma / çoxalma; ~ **of the population** əhalinin ikiqat artması/çoxalması; 2. cəmləmə, cəmlənmə, toplanma, toplama; 3. hiylə, kələk, fənd; biclik; 4. ikiüzlülük, riyakarlıq; 5. *toxuc.* əşmə, burma, əyirmə, əyrilmə

**doubly** [ˈdʌblı] *adv* 1. ikiqat çox / artıq; daha çox; ikiqat, iki dəfə; 2. ikiüzlü bir tərzdə, riyakarcasına, şərəfsizcəsinə; **to deal ~** ikibaşlı oyun oynamaq, kələkbazlıq etmək
**doubt**[1] [daut] *n* şübhə, şəkk; qərarsızlıq; qətiyyətsizlik, mütərəddidlik, tərəddüd; *There is no room for doubt Şübhəyə yer yoxdur; Some peple have expressed / raised doubts about her honesty Bəzi adamlar onun səmimiliyinə şübhə edir;* **to be in ~ 1)** şübhələnmək; 2) məlum /aydın olmamaq; *The issue of the battle is still in doubt Döyüşün nəticəsi hələ də məlum deyil; No doubt Şübhəsiz;* **to throw ~ upon *smth.*** bir şeyə şübhə etmək, bir şeyi şübhə altına almaq
**doubt**[2] [daut] *v* şübhə etmək, şübhələnmək; şübhə altına almaq; *We have no reason to doubt her story Bizim onun söylədiklərinə şübhə etməyə heç bir əsasımız yoxdur; I don't doubt that he'll come Mən şübhə etmirəm ki, o gələcək*
**doubter** [ˈdautəʳ] *n* skeptik; hər şeydən şübhələnən / hər şeyə şübhə ilə yanaşan adam
**doubtful** [ˈdautfl] *adj* 1. şübhələnən, şübhə ilə dolu, tərəddüdlü, tərəddüd edən, qətiyyətsiz; **to be ~ of *smth.*** bir şeydən şübhələnmək, bir şeyə şübhə etmək; *I am doubtful what I ought to do Nə edəcəyimi bilmirəm, Bilmirəm nə edim;* 2. şübhəli, qeyri-məlum, aydın/aşkar olmayan; anlaşılmaz; **~ reply** anlaşılmaz cavab; **~ future** qeyri-məlum gələcək; **~ case** şübhəli hadisə; **~ reputation** şübhəli ad/şöhrət; 3. ikimənalı; **~ expression** ikimənalı ifadə
**doubtfully** [ˈdautfəlı] *adv* şübhə ilə, tərəddüdlə, mütərəddid bir tərzdə / surətdə
**doubtfulness** [ˈdautfəlnıs] *n* 1. şübhəlilik; aydın / aşkar olmama; qeyri-müəyyənlik, anlaşılmazlıq; 2. qətiyyətsizlik, qərarsızlıq, tərəddüd
**doubtless** [ˈdautlıs] *adv* şübhəsiz; əlbəttə; *I shall doubtless see you tomorrow Şübhəsiz, mən səni / sizi sabah görəcəm*
**dough** [dou] *n* 1. xəmir; **to knead ~** xəmir yoğurmaq/qatmaq; *Knead the dough well Xəmiri yaxşı yoğur / yoğurun;* 2. pasta; 3. *amer. d.d.* pul, para
**dough-faced** [ˈdoufeıst] *adj amer.* tez təsir altına düşən, tez razılaşan / yola gələn, ipəyatan, yolayovuq; zəif xarakterli; ağzıboş, iradəsiz, zəif
**dough-head** [ˈdouhed] *n amer. d.d.* axmaq, səfeh, sarsaq, gic, gicbəsər; *d.d.* xəmirbaş
**doughiness** [ˈdounıs] *n* xəmir kimi; yumşaqlıq *(torpaqda)*
**doughnut** [ˈdounʌt] *n* ponçik *(içi mürəbbəli və ya şirnili kömbə qoğal)*, yumru yumşaq bulka
**doughy** [ˈdouı] *adj* 1. xəmirəbənzər, xəmirəoxşar, xəmir kimi şey *(çörək haq.)*; 2. yumşaq *(insan dərisi haq.: xəstəlikdən və sonra)*
**dour** [ˈduəʳ] *adj* 1. acıqlı, qaşqabaqlı, çox zabitəli; 2. möhkəm, mətanətli, sarsılmaz, yenilməz, fikrindən dönməyən; 3. qaşqabaqlı, qaraqabaq; tutqun; **a ~ sky** tutqun səma
**douse**[1] [daus] *n* güclü küt zərbə
**douse**[2] [daus] *v* 1. suya salmaq, batırmaq, soxmaq, basmaq *(suya və s.)*; 2. salınmaq, batırılmaq, soxulmaq *(suya və s.)*; 3. *dən.* tez /cəld aşağı salmaq *(yelkəni)*; 4. soyunmaq, çıxartmaq *(paltarı, ayaqqabını)*; 5. söndürmək; **to ~ the flame/ a fire** alovu/ocağı söndürmək; 6. dayandırmaq, arasını kəsmək
**dove**[1] [dʌv] *n* 1. *zool.* göyərçin; **~ of peace** sülh göyərçini; **white ~** ağ göyərçin; *The white dove is often used as a symbol of peace Ağ göyərçin tez-tez sülh rəmzi kimi işlənir; The dove was cooing softly Göyərçin zərif-zərif quruldayırdı;* 2. müharibədən çox sülh və bu barədə danışıq tərəfdarı olan adam
**dove**[2] [dʌv] *amer.* **to dive** *felinin pt forması*
**dovecot** [ˈdʌvkɔt] *n* göyərçin damı
**dovecote** [ˈdʌvkout] *n* = **dovecot**
**down**[1] [daun] *n* I eniş, enmə; **ups and ~s 1)** yoxuş və eniş; 2) uğursuzluq, iflasa uğrama; **ups and ~s of life / of fate** həyatın/taleyin dönüklüyü, həyatın enişləri, yoxuşları; kin, ədavət, qərəz, düşmənçilik; **to have a ~ on *smb.*** bir kəsə ədavət bəsləmək, birinə qarşı kin saxlamaq; *She has a down on me, I don't know why Onun məndən acığı gəlir, bilmirəm nə üçün*
**down** [daun] *n* II 1. zərif lələk, tük; *Pillows are filled with down Balınclar zərif tüklə doldurulmuşdur;* 2. zərif tük; *The first down was beginning to appear on the young man's face Cavan oğlanın üzündə zərif tük çıxmağa başlayırdı*
**down**[2] [daun] *adj* 1. qəmgin, qəmli, qüssəli; bədbin; **to be a bit ~** bir az qəmli/qüssəli / bədbin olmaq; 2. işləməyən *(kompüter və s. haq.)*; *You'll have to wait - the system's down this morning Sən/Siz gözləməli olacaqsan/olacaqsınız, bu səhər sistem işləmir;* 3. aşağı istiqamətlənmiş, aşağı; **~ leap** aşağı sıçrayış; 4. azalan
**down**[3] [daun] *v* 1. içkini tez/cəld içmək; *We downed our beer and left Biz pivəmizi cəld içdik və çıxıb getdik;* 2. udmaq; **to ~ medicine** dərman udmaq / cəld içmək; 3. bir şeyi vurub salmaq *(xüs. təyyarəni)*; 4. qalib gəlmək, məğlub etmək; **to ~ opposition** müxalifətə qalib gəlmək; *The government easily downed the opposition Hökumət müxalifətə asanlıqla qalib gəldi;*
◊ **to ~ tools** işi dayandırmaq, tətil etmək
**down**[4] [daun] *prep* aşağı; -dan, -dən; *The stone rolled down the hill Daş təpədən aşağı yumarlandı;* **to walk ~ the hill** dağaşağı getmək, dağdan enmək; **to fall ~ the stairs** pilləkəndən aşağı yıxılmaq; **to sail ~ the river** çayaşağı üzmək
**down-and-out** [ˈdaunəndˈaut] *adj* 1. var-yoxdan çıxarılmış/çıxmış, iflasa uğradılmış / uğramış, dilənçi halına salınmış / düşmüş, hər şeyini itirmiş; 2. *id.* nokauta düşmüş
**down-bed** [daunˈbed] *n* tük / pərqu döşək



**downcast**[1] [ˈdaunka:st] *adj* 1. aşağı dikilmiş *(gözlər haq.)*; 2. dilxor/pərt olmuş; qəmgin, kədərli, üzgün, məyus; *He seemed very downcast at the news Xəbər onu çox dilxor / məyus etdi*
**downcast**[2] [ˌdaunˈka:st] *v şair.* darıxdırmaq; kədərləndirmək, dilxor / məyus etmək
**downcome** [ˈdaunkʌm] *n* 1. eniş, enmə, endirmə, endirilmə, düşmə; 2. həqarət, təhqir
**downfall** [ˈdaunfɔ:l] *n* 1. süqut, yıxılma, iflas, dağılma; iflasa uğrama; məhv olma; **~ of a fortress** qalanın süqutu/məhv olması; 2. leysan / güclü yağış, güclü qar yağma / düşmə
**downhearted** [ˈdaunˈha:tıd] *adj* ruhdan / həvəsdən düşmüş; məyus, qəmgin, kədərli, hüznlü, dərdli; *Don't be too downhearted; things will get better Çox da ruhdan düşmə/düşməyin, işlər daha yaxşı olacaq*
**downhill**[1] [ˈdaunˈhıl] *n* eniş, yamac; **the ~ of life** ömrün qürub çağı
**downhill**[2] [ˈdaunˈhıl] *adj* eniş, enişli, mail, maili; əyilmiş; alçalan; get-gedə azalan
**downhill**[3] [ˈdaunˈhıl] *adv* 1. aşağı, aşağıya; üzüaşağı; **to run ~** üzüaşağı qaçmaq; 2. sona doğru, pisləşməyə doğru, pisləşmə istiqamətində; **to go ~** pisləşmək, xarablaşmaq, əldən düşmək
**Downing Street** [ˈdaunıŋˈstrı:t] *n* 1. Dauninq Strit *(Londonda baş nazirin iqamətgahı)*; 2. *məc.* ingilis hökuməti
**downland** [ˈdaunlænd] *n* dərəli-təpəli yer; dərəli-təpəli örüş
**downmost**[1] [ˈdaunmoust] *adj* alt, aşağı; aşağıdakı; ən alt / aşağı
**downmost**[2] [ˈdaunmoust] *adv* lap/ən aşağıda
**down-pillow** [ˈdaunˌpılou] *n* tük balınc
**down-pour** [ˈdaunpɔ:] *n* leysan, bərk/güclü / şiddətli yağış
**downright**[1] [ˈdaunraıt] *adj* 1. düz, səmimi, təmiz, vicdanlı, namuslu; **~ sort of man** vicdanlı/namuslu / səmimi adam; 2. açıq-aydın; **~ lie** açıq-aydın/ağ yalan
**downright**[2] [ˈdaunraıt] *adv* açıq, düz, açıqca, aydınca, birbaşa
**downrightness** [ˈdaunraıtnıs] *n* doğruluq, düzlük, açıqlıq; ürəyiaçıqlıq, açıqürəklilik, safqəlblilik, səmimilik
**downside** [ˈdaunsaıd] *n* 1. aşağı tərəf; 2. çatışmazlıq, mənfi cəhət; *All good ideas have a downside Bütün yaxşı ideyaların bir çatışmazlığı / mənfi cəhəti olur*
**downstair**[1] [ˈdaunˈsteəʳ] *adj,* = **downstairs**[1]
**downstair**[2] [ˈdaunˈsteəʳ] *adv,* = **downstairs**[2]
**downstairs**[1] [ˈdaunˈsteəz] *adj* aşağı, aşağıdakı; **~ rooms** birinci mərtəbədəki / qatdakı otaqlar
**downstairs**[2] [ˈdaunˈsteəz] *adv* 1. aşağı; **to go ~** aşağı getmək / düşmək; 2. aşağıda; **to wait ~** aşağıda gözləmək
**downward** [ˈdaunwəd] *adj* enən, aşağı enən / düşən, yuxarıdan aşağı; maili; **a ~ movement** üzüaşağı hərəkət; **a ~ slope** yamac; **a ~ trend in prices** qiymətlərdə aşağı düşmə meyli
**downwards** [ˈdaunwədz] *adv* ağzıüstə, üzüüstə; *She was lying face downwards on the grass O, üzüstə göy otun üstündə uzanmışdı*
**downwind** [ˈdaunwınd] *adj* dalda, küləktutmayan
**downy** [ˈdaunı] *adj* I 1. xovlu, yumşaq tüklü; yumşaq; 2. tük; **~ pillow** yumşaq / tük balınc; 3. yüngül; **~ sleep** yüngül yuxu
**downy** [ˈdaunı] *adj* II ağıllı, zirək, fərasətli, fəndgir, bic, çoxbilmiş
**downy** [ˈdaunı] *adj* III təpəli, dərə-təpəli; **a ~ place** təpəli / dərə-təpəli yer
**dowry** [ˈdauərı] *n* 1. cehiz; 2. istedad, bacarıq, qabiliyyət, vergi
**doze**[1] [douz] *n* 1. mürgü; 2. çürüntü
**doze**[2] [douz] *v* mürgüləmək; *I dozed off during the film Filmin getdiyi müddətdə mən mürgülədim/mürgü döydüm*
**dozen** [dʌzn] *n* 1. düjün *(on iki ədəd)*; **round ~** tam düjün; **in ~s, by the ~** düjünlərlə; **a ~ spoons** bir düjün qaşıq; **three ~ eggs** üç düjün yumurta; *Eggs are sold by the dozen Yumurta düjünlə satılır; Pack the eggs in dozens Yumurtaları düjünlə qablaşdır/qablaşdırın; We need three dozen boxes Bizə üç düjün qutu lazımdır;* 2. çox, çoxlu, külli; **~s of people** çoxlu adam; *I told you so dozens of times Mən sənə / sizə min dəfələrlə belə demişəm;*
◊ **baker's / devil's ~** on üç; **to talk nineteen / thirteen to the ~** nəhayətsiz olaraq danışmaq, dil boğaza qoymamaq; *It is six of one and half a dozen of the other ≅ Ya keçəl Həsən, ya da Həsən keçəl (fərq etməz)*
**dozenth** [ˈdʌznθ] *adj d.d.* on ikinci
**dozy** [ˈdouzı] *adj* 1. mürgülü, yuxulu, yarı yuxulu; əzgin, süst; *I'm feeling very dozy this day Bu gün məni yaman mürgü basır;* 2. gic, səfeh, axmaq, başıboş; *Come on, you dozy lot - use your head Ay axmaq bir tərpən, başını işlət*
**drab**[1] [dræb] *n* I 1. bozbulanıq/ sarı-palıdı rəng; 2. maraqsızlıq, solğunluq, yeknəsəqlik, yekrənglik, bircürəlik; süstlük, darıxdırıcılıq
**drab** [dræb] *n* II 1. pinti; 2. *arx.* fahişə, qəhbə, gəzəyən qadın
**drab**[2] [dræb] *adj* 1. bozbulanıq, sarı-qəhvəyi; 2. maraqsız, solğun, yeknəsəq, darıxdırıcı, usandırıcı, yorucu
**drab**[3] [dræb] *v* eyş-işrətlə məşğul olmaq; fahişəlik / qəhbəlik etmək
**drachma** [ˈdrækmə] *n (pl həm də* **-mae***)* dirhəm *(Yunanıstanda pul vahidi)*
**draff** [dræf] *n* 1. çirkab, çirkli su; qab suyu; tullantı, zibil; 2. horra *(heyvan yemi)*; 3. barda *(araq və çaxır cecəsi)*; 4. zir-zibil, köhnə-kürüş; xılt, torta
**draft**[1] [dra:ft] *n* 1. plan, çertyoj; **~ for a machine / a building** maşın / bina üçün çertyoj; **to make / to draw up a ~** çertyoj çəkmək/hazırlamaq; 2.

layihə; eskiz; **first / rough ~** ilk / qaralama layihə / eskiz; **~ of a bill** qanun layihəsi; **~ of a contract** kontraktın layihəsi; **~ of a poem / a novel / a play** poemanın / romanın / pyesin eskizi; **~ for a speech** nitqin eskizi; *This is only the first draft of my speech Bu yalnız mənim çıxışımın qaralamasıdır*; **to make/to draw up a ~** layihə hazırlamaq; 3. *mal.* çek; barat vekseli; 4. seçmə; **~ of cattle for branding** damğalamaq üçün malqaranın seçilməsi; 5. *hərb.* 1) çağırış; toplama, yığma; cəlb etmə; *The draft has affected some industries Çağırış sənayenin bəzi sahələrinin işinə təsir etdi;* 2) çağırışçılar kontingenti

**draft**[2] [dra:ft] *v* 1. layihə/eskiz/plan hazırlamaq; **to ~ a bill** qanun layihəsi hazırlamaq; **to ~ a contract** kontraktın layihəsini hazırlamaq; 2. seçmək; **to ~ a vice-presidential candidate** vitse-prezidentliyə namizəd seçmək; 3. çağırmaq *(hərbi xidmətə);* **to ~ *smb.* into the army** bir kəsi orduya çağırmaq; 4. süzmək; 5. qeyd / nişan etmək, nişanlamaq

**draft-cattle** [ˈdra:ft.kætl] *n* işlək qaramal, qoşqu heyvanı

**draftee** [.dra:fˈti:] *n* hərbi xidmətə çağırılan; çağırışçı

**drafting**[1] [ˈdra:ftɪŋ] *n* 1. tərtib etmə *(sənədi, qanun layihəsini);* 2. redaksiya, qısaca və dürüst ifadə etmə/edilmə; *The drafting of this clause is obscure Bu bənddə fikir aydın ifadə edilməyib*

**drafting**[2] [ˈdra:ftɪŋ] *adj* çertyoj; cizgi; çertyoj çəkilən; **~ board** çertyoj stolu; **~ room** *amer.* çertyoj / cizgi otağı; **~ paper** çertyoj/cizgi kağızı; **~ committee** redaksiya komitəsi

**draftsman** [ˈdra:ftsmən] *n* 1. *(pl* **-men** [-mən]) tərtibçi *(sənədi);* müəllif *(qanun layihəsinin);* 2. cizgiçi, çertyojçu; konstruktor *(konstruksiya müəllifi, konstruksiya düzəldən ixtiraçı)*; 3. həvəskar rəssam, nəqqaş

**draftsmanship** [ˈdra:ftsmənʃɪp] *n* cizgi çəkmə; rəsmxətt

**drag**[1] [dræg] *n* 1. yavaş hərəkət; **a heavy ~ uphill** dağa qalxan çətin yoxuş; 2. sürümə, sürüyüb çəkmə; **to walk with a ~, to have a ~ in *one's* walk** ayaqlarını sürümək; 3. yük, ağır yük; maneə; **to be a ~ on *smb.*** bir kəsə yük olmaq; **to be a ~ on *smb.'s* career** bir kəsin karyerasına mane olmaq; 4. *tex.* draqa *(yerqazan maşın);* ayaq qarmağı *(dirəklərə çıxmaq üçün alət);* 5. *k.t.* yük kirşəsi *(yolsuz yerlərdə atla yük daşımaq üçün xüs. xizək)*

**drag**[2] [dræg] *v* (-gg-) 1. çəkmək, sürümək; çəkib/dartıb sürümək; sürüyə-sürüyə aparmaq; **to ~ *one's* feet** ayaqlarını sürümək; **to ~ a net** toru dartıb sürümək; *We dragged the fallen tree clear of the road Yolu təmizləmək üçün biz yıxılmış ağacı dartıb kənara sürüdük; I heard the sound of something being dragged across the floor Mən nəyinsə döşəmədə sürükləndiyinin səsini eşitdim;* 2. sürünmək; *He always drags behind O həmişə arxada sürünür;* 3. uzanmaq; çox vaxt almaq; uzun çəkmək; *Time/The performance drags Vaxt/Tamaşa uzanır; The film dragged terribly Film həddindən artıq / zəhlə tökəcək dərəcədə uzandı*

**dragon** [ˈdrægən] *n* 1. *əs.* əjdaha; 2. *zool.* drakon *(qanadlı əjdaha);* 3. şeytan, iblis; 4. qəddar / insafsız adam

**dragon-fly** [ˈdrægənflaɪ] *n zool.* iynəcə

**dragoon**[1] [drəˈgu:n] *n* draqun *(keçmişdə: xüs. atlı qoşun hissələri nəfəri)*

**dragoon**[2] [drəˈgu:n] *v* bir işi görməyə vadar / məcbur etmək; **to ~ *smb.* into doing *smth.*** bir kəsi bir iş görməyə vadar / məcbur etmək *(hədə, qorxu vasitəsilə)*

**drain**[1] [dreɪn] *n* 1. kanalizasiya borusu; *We had to call in a plumber to unblock the drains Biz kanalizasiya borularını təmizləmək üçün su kəməri işçisi çağırmalı olduq;* 2. drenaj *(arxlar və ya borular vasitəsilə bataqlığın qurudulması)*; 3. axma, axıb gəlmə/çıxma, tökülmə; nov, novalça, suaxan; **~ from a leaky faucet** xarab olmuş krandan suyun axması; 4. günbəgün arıqlama / üzülmə; daimi itki; çıxar, məsarif; *It's a great drain on my health Bu mənim sağlamlığımı üzür;* 5. *d.d.* qədəh, piyalə; bir içim/qurtum; *Leave me a drain Bir qurtum mənə saxla / saxlayın;*

◊ **brain ~** "beyinlərin axını *(alimlərin ölkədən çıxıb getməsi)*; **to go down the ~** yox olmaq, qeybə çıxmaq

**drain**[2] [dreɪn] *v* 1. buraxmaq *(suyu),* axıtmaq, boşaltmaq *(suyu),* nasosla çəkmək *(suyu);* **to ~ water from a tank** suyu bakdan buraxmaq / axıtmaq; 2. tükətmək, sərf etmək, sərf edib qurtarmaq; boşaltmaq; **to ~ a country of its wealth** ölkənin var-dövlətini sərf edib tükətmək; 3. axmaq, axıb qurtarmaq *(həm də* **to ~ away***),* tərk etmək; *The bath-water slowly drained away Vannanın suyu yavaş-yavaş axıb getdi; Water will soon drain (away) Su tezliklə axıb qurtaracaq; His life was slowly draining away Həyatı onu yavaş-yavaş tərk edirdi;* 4. drenaj üsulu ilə qurutmaq *(bataqlığı),* qurutmaq; **to ~ the land** torpağı drenaj üsulu ilə qurutmaq; *This river drains the whole countryside Bu çay bütün rayonun suyunu yığır;* 5. qurumaq; *Leave the dishes to drain Qoy/Qoyun qablar qurusun*; 6. içmək, axıra qədər içmək, içib qurtarmaq; **to ~ a glass of wine** bir stəkan şərabı axıra qədər içmək / içib qurtarmaq

**drainage** [ˈdreɪnɪdʒ] *n* 1. drenaj *(arxlar və ya borular vasitəsilə bataqlığın qurudulması)*, qurudulma; 2. kanalizasiya; 3. çirkab, nəcis, murdarlıq

**drainpipe** [ˈdreɪnpaɪp] *n* drenaj borusu

**drake** [dreɪk] *n* erkək ördək, yaşılbaş

**dram** [dræm] *n* 1. dirhəm *(Yunanıstanda pul)*; 2. bir qurtum spirtli içki



**drama** [ˈdra:mə] *n* 1. drama *(pyes);* **the ~** dramaturgiya, dram ədəbiyyatı; **historical ~** tarixi drama; 2. həyəcan; *His life was full of drama Onun həyatı dramatik hadisələrlə dolu idi;*

◊ **to make a ~ out of *smth.*** bir şeyi şişirtmək/dramaya çevirmək ≅ milçəkdən fil düzəltmək; *He makes a drama of a simple visit to dentist O, adi diş həkiminə getməyi faciəyə çevirir*

**dramatic** [drəˈmætɪk] *adj* 1. dramatik, dram; teatr, bədii; **~ performance** teatr tamaşası; **~ criticism** teatr tənqidi; **~ reading** bədii qiraət; **~ unities** dramatik vəhdət *(zaman, məkan və hərəkət birliyi);* 2. dramatiklik; **a ~ representation of a real event real** hadisənin dramatik şəkildə təqdimi; **~ results** dramatik nəticələr; 3. həyəcanlı, ağır; faciəli; **~ pictures on TV** televizorda həyəcanlandırıcı səhnələr

**dramatically** [drəˈmætɪkəlɪ] *adv* dramatik olaraq / vəziyyətdə; gərgin olaraq; gözlənilmədən; *His attitude changed dramatically Onun münasibəti gözlənilmədən dəyişdi*

**dramatics** [drəˈmætɪks] *n* 1. dram sənəti; 2. tamaşa *(xüs. həvəskar aktyorlar tərəfindən oynanılan);* **amateur ~** həvəskar aktyorların oynadığı tamaşa

**dramatis personae** [ˈdra:mətɪspə:ˈsounaɪ] *n* iştirak edənlər, iştirak edənlərin siyahısı *(dram əsərində)*

**dramatist** [ˈdræmətɪst] *n* dramaturq

**dramatization, -sation** [.dræmətaɪˈzeɪʃn] *n* dramlaşdırma, dram şəklinə salma / salınma; səhnələşdirmə, səhnələşdirilmə, pyes şəklinə salma/salınma

**dramatize, -ise** [ˈdræmətaɪz] *v* 1. dramlaşdırmaq, dram şəklinə salmaq; səhnələşdirmək; 2. şişirtmək, mübaliğə etmək

**drank** [dræŋk] **to drink** *felinin pt forması*

**drape**[1] [dreɪp] *n* 1. portyer *(uzun qapı və ya pəncərə pərdəsi);* pərdə/üz çəkmə; bəzədilmə, bəzəmə *(pərdə, xalça və s. ilə);* 2. üzlük material

**drape**[2] [dreɪp] *v* 1. parça ilə bəzəmək; 2. pərdə tutmaq, üz çəkmək; bəzəmək *(pərdə, xalça və s. ilə);* 3. geyindirmək; bürümək; **to ~ a mantle arround the shoulders** mantonu çiyninə atmaq; *She had a shawl draped round her shoulders O, çiyninə şal atmışdı; He appeared on the stage draped in a huge cloak O, səhnəyə böyük bir plaş geyinmiş halda çıxdı*

**draper** [ˈdreɪpəʳ] *n* 1. arşınmalçı, arşın malı satan; 2. bəzəkçi, üzçəkən, pərdəçi

**drapery**[1] [dreɪpərɪ] *n* 1. üzçəkmə, pərdə çəkmə; bəzədilmə *(pərdə, xalça və s. ilə);* pərdə; bəzək; 2. parça, arşın malı; parça /arşın malı alveri; 3. parça mağazası; 4. geyim, paltar; 5. pərdə, üzlük və s. üçün parça / material

**drapery**[2] [ˈdreɪpərɪ] *v* 1. pərdə tutmaq/çəkmək, üz çəkmək; bəzəmək *(pərdə, xalça və s. ilə);* 2. geyindirmək; bürümək

**drastic** [ˈdræstɪk] *adj* 1. cəsarətli, ürəkli, əzmli, səbatlı, qərarından dönməyən; 2. əsaslı, köklü, qəti; **~ measures** əsaslı / köklü / qəti tədbirlər; **~ changes** əsaslı / köklü dəyişikliklər; *Drastic changes are necessary to improve the government of the country Ölkənin idarə edilməsini təkmilləşdirmək üçün əsaslı/köklü dəyişikliklər etmək lazımdır*; 3. bərk təsir edən, çox təsirli / güclü; **~ remedies** çox təsirli vasitələr; **~ medicine** çox güclü dərman; 4. kəskin, ciddi; **a ~ shortage of food** kəskin ərzaq çatışmazlığı

**drastically** [ˈdræstɪkəlɪ] *adv* 1. cəsarətlə, əzmlə, mətanətlə; qeyrətlə; qəti surətdə, qətiyyətlə; 2. əsaslı surətdə, kökündən; *Expenditure has been drastically reduced Xərc əsaslı surətdə azaldılıb*

**drat** [dræt] *inter. (narahatlıq, nigaranlıq və s. ifadə edir) Drat (it)! My watch has stopped Zəhrimara qalsın! Saatım dayanıb*

**dratted** [ˈdrætɪd] *adj* zəhrimara qalmış; lənətə gəlmiş; *This dratted pen won't write Bu zəhrimara qalmış qələm yazmır*

**draught** [dra:ft] *n* I 1. yelçəkən, cərəyan edən yel, hava cərəyanı, otaqda bir-birinin qarşısında olan açıq yerlərdən gəlib keçən kəskin hava / yel; **to sit in a ~** yelçəkəndə oturmaq; *There is a draught here Burada yelçəkən var;* 2. *tex.* hərəkət qüvvəsi, dartma qüvvəsi, dartıcı qüvvə; **beast of ~** qoşqu heyvanı; 3. süzülmə; **beer on ~** çəllək pivəsi; 4. udum, qurtum; **~ of water** bir qurtum su; **~ of happiness** bir anlıq xoşbəxtlik; **to drink *smth.* at / in / a / one ~** bir şeyi bir nəfəsə / birdən içmək; 5. axın *(su haq.);* 6. qullab, çəkim; **deep ~** dərin qullab; 7. *tib.* qabar, suluq, uçuq;

◊ **to feel the ~** əlverişsiz vəziyyətdə / şəraitdə olmaq

**draught** [dra:ft] *n* II *pl* dama, dama oyunu; **to play ~s** dama oynamaq; **to make a move at ~s** dama oyununda gediş etmək

**draught-board** [ˈdra:ftbɔ:d] *n* dama taxtası

**draught-horse** [ˈdra:fthɔ:s] *n* qoşqu atı

**draught-net** [ˈdra:ftnet] *n* balıq toru

**draughty** [ˈdra:ftɪ] *adj* yelçəkənli; **~ room / corridor** yelçəkənli otaq / dəhliz

**draw**[1] [drɔ:] *n* 1. hərəkət; çəkmə, dartma, çəkilmə, dartılma, çəkib/ dartıb çıxartma; siyirmə *(xəncəri, qılıncı və s.);* **to beat to the ~** silahı düşməndən qabaq çıxartmaq; *He was quick on the draw O, dərhal qılıncı siyirdi;* 2. *d.d.* tamaşaçını cəlb edən hər hansı bir şey; cazibə; tələ yemi; *The new play proved a great draw Yeni pyes böyük maraq oyatdı;* 3. fitnəkar/provokasiya məqsədilə edilən irad, fitnəkar sual; 4. püşk / çöp atma; lotereya; 5. püşkə düşən şey; uduş; 6. *bot.* zoğ, cavan budaq; 7. *amer.* kamodun siyirmə qutusu / yeşiyi; 8. *amer.* körpünün açılıb-yığılan hissəsi

**draw**[2] [drɔ:] *v (pt* **drew** [dru:]; *pp* **drawn** [drɔ:n] ) I 1. dartmaq, çəkmək, sürümək, dartıb sürümək; **to ~ a train / a car** qatarı / maşını dartmaq; **to ~ a net** tor çəkmək / dartmaq; 2. yavaş-yavaş getmək; sürünmək; *The cart drew slowly along the road Araba yavaş-yavaş yolla getdi;* 3. yaxına / qabağına çəkmək, yaxınlaşdırmaq; **to ~ a book towards oneself** kitabı özünə tərəf / qabağına çəkmək; *Draw your chair nearer to the table Stulunu / Stulunuzu stola tərəf çək / çəkin;* 4. yaxınlaşmaq; yaxınına gəlmək; *We drew near the town Biz şəhərə yaxınlaşdıq / yaxın gəldik;* 5. dartmaq, çəkmək; dartıb /çəkib uzatmaq; **to ~ a rope** kəndiri dartmaq; **to ~ a bow** kirişi dartmaq; **to ~ rein/ bridle** yüyəni çəkmək *(atı dayandırmaq); He drew the blanket over his head O, yorğanı başına çəkdi;* **to ~ *smth.* tight** bir şeyi tarım çəkmək; 6. əyilmək, sir-sifəti dəyişmək/əyilmək; **to ~ tight / taut** tarım çəkilmək / dartılmaq; *His face was drawn with pain Onun sifəti ağrıdan əyilmişdi;* 7. cəzb/cəlb etmək, yönəltmək; toplamaq; **to ~ an audience** dinləyici cəzb etmək/ toplamaq; *The accident drew a great crowd Hadisə yerinə çoxlu adam toplandı;* **to ~ *smb.'s* attention to *smth.*** bir kəsin diqqətini bir şeyə cəlb etmək / yönəltmək; 8. çıxartmaq, dartıb / çəkib çıxartmaq; **to ~ a nail** mıxı / mıxçanı çəkib / dartıb çıxartmaq; **to ~ a tooth** dişi çəkmək / çıxartmaq; **to ~ bread from the oven** çörəyi sobadan /kürədən çıxartmaq; **to ~ a root from the ground** kökü *(bitkini)* torpaqdan dartıb/çəkib çıxartmaq; **to ~ stone from a quarry** karxanadan daş çıxartmaq; **to ~ water from a well** quyudan su çıxartmaq / çəkmək; 9. seçmək, müəyyənləşdirmək; **to ~ a sample** nümunə seçmək / götürmək; 10. *id.* heç-heçə qurtarmaq; **to ~ the game** oyunu heç-heçə qurtarmaq; 11. dartmaq, dartıb/çəkib açmaq; **to ~ the window-curtains** pəncərə pərdələrini dartıb açmaq; **to ~ the curtain** pərdəni qaldırmaq / açmaq; 12. almaq *(cavab və s.);* **to ~ no reply** cavab almamaq; 13. əldə etmək *(gəlir),* almaq *(əmək haqqı);* **to ~ *one's* income from writing** qazancını yazıdan əldə etmək, ədəbi əsər yazmaqla gəlir əldə etmək/yaşamaq; 14. götürmək *(hesabdan pul);* **to ~ money from a bank** bankdan pul götürmək; 15. ibrət dərsi almaq; **to ~ a lesson from *smth.*** bir şeydən ibrət dərsi almaq; 16. çıxartmaq *(nəticə);* **to ~ a conclusion from *smth.*** bir şeydən nəticə çıxartmaq; 17. püşk atmaq / çəkmək; 18. çəkmək, almaq; **to ~ a deep breath** dərindən nəfəs çəkmək/ almaq; *The chimney draws well Buxarı yaxşı çəkir;* 19. vadar etmək *(danışmağa və s.);* **to ~ *smb.* to do *smth.*** bir kəsi bir iş görməyə məcbur/vadar etmək; *The girl's behaviour drew him to say the truth Qızın davranışı onu həqiqəti deməyə vadar etdi;* **to ~ *smb.* into *smth.* / into doing *smth.*** bir kəsi bir işi görməyə məcbur etmək; 20. bir kəsdən bir şey almaq; *It was difficult to draw the facts from the witness Şahiddən faktları almaq çox çətin idi;* **to ~ round *smth.*** bir şeyin ətrafına yığılmaq; *The whole family drew round the table Bütün ailə stolun ətrafına yığıldı;* **to ~ aside** bir tərəfə çəkmək; **to ~ away *(from)*** yayındırmaq; **to ~ *smb.'s* mind from *smth.*** bir kəsin fikrini bir şeydən yayındırmaq; **to ~ *smb.* away from his work** bir kəsi işindən yayındırmaq; **to ~ back** imtina etmək, geri götürmək *(sözü, vədi və s.);* **to ~ down** endirmək, aşağı salmaq; **to ~ down the curtain** pərdəni aşağı salmaq / endirmək; **to ~ in** 1) içəri çəkmək *(nəfəsi);* **to ~ in *one's* breath** nəfəsini içinə çəkmək; 2) azaltmaq; **to ~ in *one's* expenditure** xərclərini azaltmaq; 3) qısalmaq; *The evenings are drawing in Gecələr qısalır;* 4) sona yaxınlaşmaq / çatmaq; *The day drew in Gün sona yaxınlaşdı / çatdı;* **to ~ out** uzanmaq, uzun çəkmək *(nitq, tamaşa və s. haq.);*

◊ **to ~ a knife** *(bir kəsi)* bıçaqla hədələmək; **to ~ the sword** qılınc oynatmaq, davaya başlamaq; **to ~ a blank** 1) uduşsuz bilet *(lotereya)* çəkmək; 2) müvəffəqiyyətsizliyə uğramaq, əliboş qayıtmaq; **to ~ first blood** birinci zərbə endirmək; **to ~ the first breath** doğulmaq; **to ~ *one's* last** son dəfə nəfəs almaq, ölmək; **to ~ *smb.'s* teeth** bir kəsi zərərsizləşdirmək ≅ ilanın dişini sındırmaq

**draw** [drɔ:] *v* II *(pt* **drew** [dru:]; *pp* **drawn** [drɔ:n]) 1. çəkmək *(şəkil);* təsvir etmək; **to ~ cartoons** karikatura çəkmək; **to ~ a character** xarakteri təsvir etmək; 2. tərtib etmək; **to ~ a document / a will** sənəd / vəsiyyət tərtib etmək

**drawback** ['drɔ:bæk] *n* 1. nöqsan, qüsur; *The only drawback of the plan is that it costs too much Planın yeganə nöqsanı odur ki, o çox xərc tələb edir;* 2. manеə, əngəl; **to succeed in spite of ~s** manеələrə baxmayaraq məqsədinə nail olmaq

**drawbridge** ['drɔ:brɪdʒ] *n* qaldırılan körpü; *Lower the drawbridge Körpünü endir / endirin; Raise the drawbridge Körpünü qaldır / qaldırın*

**drawer** ['drɔ:əʳ] *n* 1. siyirmə; *You can find the envelope in the middle drawer of my desk Sən / Siz zərfi mənim yazı stolumun orta siyirməsində tapa bilərsən/bilərsiniz;* 2. cizgiçi, çertyojçu; həvəskar rəssam, nəqqaş; *I'm not a very good drawer Mən çox da yaxşı rəssam deyiləm*

**drawers** [drɔ:z] *n (Özündən sonra fel cəmdə işlənir)* alt tuman, kişi tumanı, dizlik

**drawing** ['drɔ:ɪŋ] *n* 1. çəkmə, dartma; çəkilmə, dartılma; gərmə, gərilmə; 2. lotereya; 3. *id.* püşk atma; 4. bir çimdik çay *(dəmləmək üçün);* 5. çertyoj; 6. rəsmxətt; cizgi çəkmə; 7. şəkil; şəkil çəkmə; **~ of a tree** ağac şəkli; 8. plan, diaqram, şəkil *(karandaş və ya tabaşirlə çəkilmiş);* **a collection of children's ~s** uşaqların şəkillərinin kolleksiyası



**drawing-board** ['drɔ:ɪŋbɔ:d] *n* çertyoj/cizgi taxtası

**drawing-room** ['drɔ:ɪŋru:m] *n* qonaq otağı

**drawl** [drɔ:l] *v* saitləri uzada-uzada tənbəlcəsinə danışmaq; *He drawled a few words of apology O, əfv edilməsi üçün uzada-uzada bir neçə söz dedi*

**drawn**[1] [drɔ:n] *adj* çox yorğun/əzgin görünən, solğun, qayğılı; *Her face was pale and drawn after weeks of sleepless nights Həftələrlə yuxusuz gecələrdən sonra onun sifəti solğun və əzgin idi*

**drawn**[2] [drɔ:n] **to draw** *felinin pp forması*

**dray** [dreɪ] *n* araba *(ağır yükləri, xüs. pivə çəlləklərini daşımaq üçün yanları açıq və alçaq)*

**dread**[1] [dred] *n* 1. bərk qorxu, dəhşət, hövl, vahimə; **to have a ~ of *smth.*** bir şeydən bərk qorxmaq / dəhşətə gəlmək; **to live / to be in ~ of *smth.*** bir şeyin qorxusu altında yaşamaq; 2. uyuq, qorxuluq; qorxulu / dəhşətli adam; dəhşət yaradan adam

**dread**[2] [dred] *adj* qorxunc, dəhşətli, qorxu / dəhşət yaradan

**dread**[3] [dred] *v* qorxmaq, çəkinmək, ehtiyat etmək; sarsımaq; titrəmək, ürpənmək; **to ~ illness / being ill** xəstəlikdən qorxmaq; **to ~ dying / to die** ölümdən qorxmaq; *We all dread to think what will happen if the factory closes Biz hamımız fabrikin bağlandığı halda nə baş verəcəyi haqqında fikirləşməkdən qorxuya düşürük;* **to ~ the coming winter** yaxınlaşmaqda olan qış haqqında fikirdən ürpənmək / sarsımaq

**dreadful** ['dredfl] *adj* 1. dəhşətli, qorxulu, qorxunc, müdhiş; heybətli; **~ weather** dəhşətli hava; *What dreadful weather! Nə dəhşətli havadır!;* **~ pain** dəhşətli ağrı; **a ~ country** qorxulu ölkə; *The noise was dreadful Səs dəhşətli/ müdhiş idi; I'm afraid it's all a dreadful mistake Mən qorxuram, bu, dəhşətli səhv olsun;* **a ~ disease** qorxulu / dəhşətli xəstəlik; **a ~ nightmare** dəhşətli/ qorxunc yuxu; 2. qeyzli, acıqlı, hirsli; **~ voice** acıqlı səs; **a ~ man** acıqlı/qeyzli adam; 3. cansıxıcı, maraqsız, zəhlətökən; *The play last night was just dreadful Dünən axşamkı tamaşa çox maraqsız idi*

**dreadfully** ['dredfəlɪ] *adv* çox, son dərəcə, həddən artıq, olduqca; *I'm dreadfully tired Mən son dərəcə / olduqca yorğunam; I'm dreadfully glad to see you Mən səni / sizi görməyimə çox şadam; I miss you dreadfully Mən səndən / sizdən ötrü çox darıxıram*

**dream**[1] [dri:m] *n* 1. yuxu, yuxu görmə, röya; **to see *smth.* in ~** bir şeyi yuxuda / röyada görmək; **a vivid ~** aydın yuxu; **a disturbing ~** narahatedici yuxu / röya; **to awake from a ~** yuxudan ayılmaq, oyanmaq; **to go to *one's* ~** uzanıb yatmaq; 2. arzu; **the ~s of youth** gənclik / cavanlıq arzuları; **an impossible ~** qeyri-real arzu; **to fulfil / to realize *one's* ~** arzusunu həyata keçirmək; **to realize all *one's* ~s** bütün arzularını həyata keçirmək; **to live in a ~** arzu ilə yaşamaq; *He has dreams of being an actor O, aktyor olmaq arzusu ilə yaşayır;* 3. xəyal, xülya, xəyalat; **sweet ~** şirin xəyal / xülya

**dream**[2] [dri:m] *v (pt pp* **dreamt** [dremt] *və ya* **dreamed** [dri:md]) 1. yuxu görmək; *You must have dreamed it Yəqin sən / siz bunu yuxuda görmüsən / görmüsünüz;* **to ~ of / about home** evi yuxuda görmək; *I dreamed that I was at home Yuxumda gördüm ki, evdəyəm; I dreamed about you last night Mən səni / sizi keçən gecə yuxuda gördüm;* 2. xəyal / arzu etmək; xülyaya qapılmaq; şirin xəyala dalmaq; **to ~ of happiness** xoşbəxt olmağı arzu etmək;

◊ **to ~ away / out** vaxtını arzular aləmində keçirmək; **to ~ away / out *one's* life** şirin arzularla yaşamaq

**dreamer** ['dri:məʳ] *n* xəyalçı, xəyalpərəst *(adam),* fantaziyaçı, həyat reallığından ayrı düşmüş adam

**dreamery** ['dri:mrɪ] *n* xəyalpərəstlik, xülyaçılıq

**dreamily** ['dri:mɪlɪ] *adv* 1. yuxulu-yuxulu, yuxulu halda / tərzdə; 2. xəyalpərəstliklə, dalğın halda

**dreaminess** ['dri:mɪnɪs] *n* 1. xəyalçılıq, xəyalpərəstlik; 2. dalğınlıq, fikirlilik

**dreamland** ['dri:mlænd] *n* xəyallar / nağıllar aləmi; yuxu

**dreamless** ['dri:mlɪs] *adj* yuxugörməyən, röyagörməyən

**dreamlike** ['dri:mlaɪk] *adj* xəyali, əfsanəvi; misli görünməmiş, qeyri-adi, xariqüladə; **a ~ landscape** misli görünməmiş / qeyri-adi mənzərə

**dreamy** ['dri:mɪ] *adj* 1. xülyaçı, xəyalpərəst; dalğın, fikirli; **~ eyes** dalğın / fikirli gözlər; 2. qarışıq, tutqun, dumanlı, anlaşılmaz, qeyri-müəyyən; *I only have a dreamy recollection of what happened Baş verənlər haqqında mənim yalnız tutqun / qaranlıq təsəvvürüm var;* 3. xoşagələn, könüloxşayan; **~ music** könüloxşayan musiqi; 4. *sl.* çox gözəl / qəşəng; *What a dreamy little house! Nə gözəl / qəşəng balaca otaqdır!*

**drearily** ['drɪərəlɪ] *adv* 1. tutqun, qaşqabaqlı, pərt; 2. maraqsız; darıxdırıcı, cansıxıcı, üreksıxıcı

**dreariness** ['drɪərɪnɪs] *n* 1. tutqunluq; qaşqabaqlılıq, pərtlik; 2. maraqsızlıq, darıxdırıcılıq, cansıxıcılıq, üreksıxıcılıq; **the ~ of the landscape** mənzərənin darıxdırıcılığı / cansıxıcılığı

**dreary** ['drɪərɪ] *adj* 1. qaranlıq; tutqun; **a ~ room** qaranlıq otaq; **a ~ winter day** tutqun bir qış günü; 2. maraqsız, cansıxıcı, üreksıxıcı; **~ speech** maraqsız / cansıxıcı nitq

**dredge**[1] [dredʒ] *n* I 1. *tex.* draqa *(yerqazan maşın);* **hydraulic ~** hidravlik draqa/torpaqsoran

maşın *(dənizlərdə, çaylarda torpağı nasos vasitəsilə çıxaran maşın);* **2**. istridyə *(yeyilən dəniz ilbizi)* ovlamaq üçün tor

**dredge²** [dredʒ] *v* **1**. *tex.* draqa ilə dərinləşdirmək / qazmaq, draqa ilə çıxartmaq *(torpağı, lili) (həm də* **to ~ away/out/up***); They have to dredge the canal so that ships can use it Gəmilərin istifadə edə bilməsi üçün onlar kanalı draqa ilə dərinləşdirməlidirlər;* **2**. torla istridyə ovlamaq

**dredge** [dredʒ] *v* II səpmək; **to ~ flour over meat, to ~ meat with flour** ətin üstünə un səpmək

**dredger** [ˈdredʒəʳ] *n tex.* draqa *(yerqazan maşın)*; çoxçömçəli ekskavator

**dregs** [dregz] *n* **1**. xılt, torta, çöküntü; tullantı; *He drank / drained coffee to the dregs O, kofeni tortasına qədər içdi;* **2**. tör-töküntü, tullantı; pozğun ünsürlər; **~ of society** cəmiyyətin tör-töküntüləri

**dreggy** [ˈdregɪ] *adj* bulanıq; tutqun, dumanlı; çirkli, kirli, bulaşıq, bozbulanıq

**drench¹** [drentʃ] *n* **1**. islanma; **2**. güclü yağış, leysan; **3**. *tib.* dərmanın böyük dozası *(xüs. heyvanlar üçün)*

**drench²** [drentʃ] *v* **1**. islanmaq, bərk islanmaq; **to be ~ed through, to get ~ed to the skin** iliyinə/sümüyünə qədər islanmaq; *We were caught in the storm and got drenched to the skin Biz tufana düşdük və iliyimizə/sümüyümüzə qədər islandıq;* **2**. nəm etmək, islatmaq; *Their faces were drenched with sweat Onların üzü tərdən nəmlənmişdi;* **to ~ oneself in perfume** özünü ətirlə islatmaq/ətirə qərq etmək

**dress¹** [dres] *n* **1**. paltar, üst-baş *(qadın üçün)*; **a long/short ~** uzun/gödək paltar; **silk ~** ipək paltar; **a wedding ~** toy paltarı; **formal ~** rəsmi paltar; **traditional ~** ənənəvi paltar; **morning ~ 1)** ev paltarı; **2)** vizitka *(rəsmi görüşlərdə geyilən xüsusi biçimli sürtük);* **fancy ~** maskarad paltarı; **2**. libas, geyim; **spring ~** *məc.* bahar libası

**dress²** [dres] *adj:* paltar, paltarlıq; **~ cutter** paltar biçən **~ model** paltar fasonu; **~ goods** paltarlıq parça; **~ uniform** parad geyimi / paltarı

**dress³** [dres] *v* **1**. geyindirmək; geyinmək; **to ~ a child** uşaq geyindirmək; **to ~ oneself** geyinmək; **to ~ for dinner** nahardan əvvəl paltarını dəyişmək; **to ~ well/badly /fashionably** yaxşı/pis/dəbli geyinmək; *She takes ages to dress Onun geyinməyi çox uzun çəkir; She dresses in black / in white O, qara / ağ geyinir;* **2**. bəzəmək; səliqəyə/qaydaya salmaq, yığıb-yığışdırmaq; **to ~ a shop window** dükanın vitrinini səliqəyə salmaq/bəzəmək; **to ~ streets with flags** küçələri bayraqlarla bəzəmək; **to ~ a Christmas tree** yeni il yolkasını bəzəmək; **3**. hazırlamaq, bişirmək; xörəyə dadverən ədviyyat və s. qatmaq; **to ~ a chicken** çolpanı təmizləyib bişirmək üçün hazırlamaq *(müxt. ədvalar vurmaqla)*; **4**. qaydaya salmaq; **to have *one's* hair ~ed** saçını düzəltdirmək /qaydaya saldırmaq; **5**. sarımaq, sarıq qoymaq *(yaraya);* **6**. budamaq, kəsmək *(ağacı);* **7**. *k.t.* peyin səpmək, peyinlə gübrələmək, gübrə vermək *(torpağa);* **8**. sovurmaq *(taxılı);* **9**. aşılamaq *(dərini);* **10**. qaşovlamaq *(atı);* **to ~ down** şiddətli / bərk töhmət etmək; qulaqburması vermək, bərk tənbeh etmək; **to ~ out 1)** bəzəmək, bəzək-düzək vermək; **2)** bəzənmək, bəzənib-düzənmək; **to ~ up** bəzəmək; bəzənmək; **11**. *hərb.* düzləndirmək, düz sıraya düzmək; **to ~ the ranks** cərgələri düzləndirmək; **to ~ to / by the right/the left** sağa/sola düzlənmək; *Dress! Düzlən (komanda)*

**dress-circle** [ˈdresˈsə:kl] *n teatr.* beletaj *(teatrda ikinci mərtəbədəki lojalar)*

**dress-coat** [ˈdresˈkout] *n* frak *(qabaq ətəkləri kəsik, dal tərəfdən isə uzun dar ətəkləri olan sürtük)*

**dressed** [drest] *adj* **1**. geyinmiş; geyindirilmiş; *Aren't you dressed yet? Sən/Siz hələ geyinməmisən/geyinməmisiniz? He was beautifully dressed O, gözəl geyinmişdi*; **to get ~** geyinmək; *She got dressed and went out O geyinib getdi / çıxıb getdi*; **2**. bəzənmiş; bəzədilmiş; səhmana salınmış, bəzək-düzək verilmiş; **3**. minilmiş, minilməyə öyrədilmiş *(at haq.);* **4**. aşılanmış *(dəri haq.)*

**dresser** [ˈdresəʳ] *n* **1**. mətbəx şkafı; **2**. kostyumçu *(teatrda kostyumlara baxan və aktyorları geyindirən adam);* **3**. gön-dəri istehsalı ustası / fəhləsi; dəriçi, gönçü; dabbaq; **4**. cərrahiyyə tibb bacısı; **5**. *k.t.* toxumtəmizləyən mexanizm

**dressing** [ˈdresɪŋ] *n* **1**. geyinmə; *Dressing always takes her such a long time Onun geyinməyi həmişə çox vaxt aparır;* **2**. *tib.* sarğı; **to change a ~** sarğını dəyişmək; **to apply a ~** sarğı qoymaq; **3**. bəzəmə, bəzək /zinət vermə; **4**. qaşovlama *(atı);* **5**. *k.t.* gübrə / peyin vermə

**dressing-down** [ˈdresɪŋˈdaun] *n d.d.* töhmət; bərk məzəmmət, qulaqburması; **to give *smb.* a good ~** bir kəsə yaxşıca qulaqburması vermək

**dressing-gown** [ˈdresɪŋgaun] *n* xalat, penuar

**dressing-machine** [ˈdresɪŋmə.ʃi:n] *n k.t.* sovurucu maşın, dənsovuran maşın

**dressing-out** [ˈdresɪŋˈaut] *n* atı öyrətmə *(minilməyə, qoşulmağa)*

**dressing-room** [ˈdresɪŋrum] *n* **1**. paltar geyilib-soyunulan otaq *(xüs. idmançılar üçün);* **2**. qarderob *(ictimai binalarda)*

**dressing-station** [ˈdresɪŋ.steɪʃn] *n tib.* sarğı məntəqəsi, təcili yardım məntəqəsi

**dressing-table** [ˈdresɪŋ.teɪbl] *n* **1**. bəzək stolu; **2**. sarğı stolu

**dressmaker** [ˈdres.meɪkəʳ] *n* dərzi *(qadın, qız)*

**dressmaking** [ˈdres.meɪkɪŋ] *n* tikmə *(paltar)*, qadın paltarlarının fərdi tikişi

**dress-preserver** [ˈdresprɪˈzə:vəʳ] *n* tərlik *(qoltuq altı üçün)*





**dressy** [ˈdresɪ] *adj* **1**. dəblə geyinməyi sevən, modaya müvafiq geyinən; dəbli, modalı; çox bəzəkli; **2**. dəbdəbəli, möhtəşəm, təntənəli; cahcalallı *(qəbul və s. haq.)*

**drew** [dru:] **to draw** *felinin pt forması*

**dribble¹** [ˈdrɪbl] *n* **1**. kiçik çay; **2**. damcı, gilə; **3**. çiskin / narın yağış; **4**. *id.* dribling

**dribble²** [ˈdrɪbl] *v* **1**. damcı-damcı buraxmaq *(mayeni);* damcılamaq, damcı-damcı axmaq; **to ~ from the eaves** karnizdən damcılamaq; *Water was dribbling out of the tap Su krandan damcılayırdı;* **2**. selik axıtmaq *(uşaq haq.); Take care the baby doesn't dribble over your suit Ehtiyatlı ol/olun, uşaq kostyumuna/kostyumunuza selik salar;* **3**. *id.* dribling etmək *(rəqibi aldadaraq topu ötürmək)*

**dribbler** [ˈdrɪbləʳ] *n* fəndgirliklə topu aparan oyunçu

**dried** [draɪd] *adj* quru, qurudulmuş; **~ milk** quru/qurudulmuş süd; **~ vegetables** qurudulmuş tərəvəzlər; **~ fruit** qurudulmuş meyvə

**dried** [draɪd] **to dry** *felinin pt, pp formaları*

**drift¹** [drɪft] *n* **1**. axın; **the ~ of current** cərəyanın axını; **the ~ of people from the country into the towns** insanların/adamların kənddən şəhərə axını; **2**. *dən.* dreyf *(gəminin küləyin və ya axının təsirilə yolundan kənara çıxması);* **3**. insanların bir şeydən yavaş-yavaş uzaqlaşması; **a ~ away from traditional values** ənənəvi dəyərlərdən yavaş-yavaş uzaqlaşma; **a slow ~ into debt** yavaş-yavaş borca düşmə; **4**. ümumi məna; gizli məqsəd; *I can't quite catch the drift of what you're saying Mən sənin/sizin nə dediyini/dediyinizi tam başa düşə bilmirəm;* **5**. *hərb.* derivasiya *(güllənin uçuş zamanı yana meyli);* **6**. tüstünün, buludun və ya zəhərləyici maddənin hərəkəti; **7**. gediş, meyl; **~ of affairs** işlərin gedişi, hadisələrin inkişaf istiqaməti; **8**. *dilç.* dilin quruluşunun inkişaf istiqaməti; **9**. passivlik, fəaliyyətsizlik, laqeydlik, süstlük, ətalət; **policy of ~** laqeydlik/fəaliyyətsizlik siyasəti; **10**. *k.t.* sürmə *(heyvanı);* **11**. *amer.* yaralıların daşınması *(arxa cəbhəyə);* **12**. bərk /güclü leysan, küləyin qovduğu qar / qum/quru yarpaq; **13**. *tex.* deşikaçan *(alət)*

**drift²** [drɪft] *v* **1**. aparmaq, qovmaq, qovub aparılmaq *(axın və ya külək tərəfindən);* **to ~ logs down the stream** çayla ağac axıtmaq *(bir yerdən başqa yerə daşımaq məqsədilə);* **2**. gətirilmək, çıxarılmaq; **to ~ ashore** sahilə çıxarılmaq; **3**. axın istiqamətində üzmək; taleyin hökmünə ümid etmək/olmaq; **to ~ through life** qayğısız yaşamaq; **4**. təpə halına / şəklinə salmaq, bir yerə yığmaq; basmaq *(qar və s.); The snow had drifted everywhere Qar hər tərəfi basmışdı;* **to ~ apart** dağılmaq, dağılışmaq, dağılıb getmək

**drifter** [ˈdrɪftəʳ] *n* avara, səfil, yaramaz, heç nəyə yaramayan *(adam)*

**driftwood** [ˈdrɪftwud] *n* axıdılmış ağac, sahilə atılmış ağaclar *(dalğa vasitəsilə)*

**drill¹** [drɪl] *n* I **1**. *tex.* burğu, matqab; **twist ~** spiral burğu; **2**. *tex.* bur, burov *(qazma maşını)*

**drill** [drɪl] *n* II **1**. məşq, çalışma, təmrin; məşğələ; **~ in grammar** qrammatikadan məşğələ; **to learn / to do *one's* ~** çalışma etmək; **pronunciation ~s** fonetik çalışmalar, tələffüz çalışmaları; **2**. *hərb.* döyüş/ sıra təlimi; **infantry ~** piyada qoşunların sıra/döyüş təlimi

**drill** [drɪl] *n* III **1**. *k.t.* cərgəli toxumsəpən; **2**. cərgəli toxumsəpmə; **3**. şırım *(kotanın və s. torpaqda açdığı iz)*

**drill** [drɪl] *n* IV *zool.* mandril *(Qvineyada yaşayan meymun cinsi)*

**drill²** [drɪl] *v* I **1**. deşmək, dəlmək *(burğu ilə);* **to ~ a hole** deşik/dəlik açmaq *(burğu ilə);* **2**. qazmaq *(quyu, tunel); They're drilling a new tunnel under the Thames Onlar Temza çayı altından yeni tunel çəkirlər / qazırlar*

**drill** [drɪl] *v* II **1**. çalışdırmaq; öyrətmək; məşq etdirmək *(həm də id.);* **to ~ *smb.* in Latin** bir kəsə latın dili öyrətmək; **to ~ a dog to do *smth.*** itə bir iş görməyi öyrətmək; **2**. doldurmaq; **to ~ knowledge into *smb.*** bir kəsin başına zorla bilik doldurmaq; **3**. *hərb.* sıra/döyüş təlimi vermək; **to ~ troops** qoşunlara döyüş təlimi vermək

**drill** [drɪl] *v* III *k.t.* səpmək *(cərgə ilə)*, cərgəli səpin aparmaq

**drill-barrow** [ˈdrɪl.bærou] *n k.t.* yuva üsulu ilə səpin

**drink¹** [drɪŋk] *n* **1**. içmə; **food and ~** yemə və içmə; **2**. içki; **soft ~s** spirtsiz içkilər; **strong / ardent ~** spirtli/tünd içki; *Drink is a growing problem among the young İçki gənclər arasında artan bir problemdir* **3**. qurtum, udum, içim; bir udum / qurtum / içim; **~ of water/of milk** bir qurtum su/ süd; *She took a drink and put the glass down O, bir qurtum içib, badəni yerə qoydu;*

◊ **in ~** sərxoş, kefli; **to be on the ~** bərk sərxoşluq etmək

**drink²** [drɪŋk] *v* (*pt* **drank** [dræŋk]; *pp* **drunk** [drʌŋk]) **1**. içmək; **to ~ water/ milk/beer/coffee, etc.** su/süd/pivə / kofe və s. içmək; **to ~ to *smb.'s* health** bir kəsin sağlığına içmək; **2**. sərxoşluq etmək, içmək *(spirtli içkilər);* **to ~ hard / deep** həddən artıq / bərk içmək, ayıq vaxtı olmamaq; **to ~ oneself drunk** keflənənə qədər içmək; **3**. sağlıq demək, sağlığa içmək; **to ~ *(to)* the host / to *smb.'s* health** ev yiyəsinin / bir kəsin haqqında sağlıq demək; **4**. çəkmək, canına çəkmək *(bitki haq.);* **to ~ up moisture** nəmi canına çəkmək *(bitki haq.);* **5**. içkiyə xərcləmək / sərf etmək *(pulu);* **to ~ away *one's* earnings** qazandığını içkiyə xərcləmək; **to ~ down / in** mənimsəmək, dərk etmək *(elmi və s.);* **to ~ in**

learning həvəslə elm mənimsəmək; to ~ off axıra qədər içmək;

◊ to ~ it doyunca içmək, içib keflənmək /sərxoş olmaq; həzz/nəşə almaq, nəşələnmək; to ~ like a fish mütəmadi olaraq içmək, ayıq vaxtı olmamaq, *d.d.* küpünə girmək

**drinkable** ['drıŋkəbl] *adj* içməli, içməyə yararlı; ~ water içməli su; *Is this water drinkable? Bu su içməlidirmi?*

**drinker** ['drıŋkə'] *n* 1. əyyaş, içki düşkünü; 2. adətən bir növ içki içən adam; beer ~s pivə içməyi sevənlər; a coffee ~ qəhvə içməyi sevən adam

**drink-driver** ['drıŋk'draıvə'] *n* sərxoş halda / vəziyyətdə maşın sürən sürücü

**drnking-water** ['drıŋkıŋ.wɔ:tə'] *n* içməli su

**drip**[1] [drıp] *n* 1. damcı, damcılama; the steady ~ of water from a tap suyun krandan aramsız olaraq damcılaması; 2. damcının aramsız səsi

**drip**[2] [drıp] *v* (-pp-) (down) damcılamaq; dammaq; axmaq; *Rain was dripping (down) from the trees Yağış ağaclardan damcılayırdı; Is that roof still dripping Bu dam hələ də axıdırmı?;*

◊ *He is dripping wet O, iliyinə qədər islanıb*

**drip-drop** ['drıpdrɔp] *n* damcı səsi

**dripping** ['drıpıŋ] *adj* 1. daman, damcılayan, damcı-damcı axan; 2. yaş, islanmış; ~ coat bərk islanmış palto

**dripstone** ['drıpstoun] *n* su daşı

**drive**[1] [draıv] *n* 1. getmə, gəlmə *(miniklə)*; sürmə; full ~ tam sürətlə; 2. gəzmə, gəzinti, gəzintiyə çıxma *(maşında və s.)*; to go for a ~ gəzintiyə çıxmaq *(miniklə)*; *Let's go for a drive in the country Gəlin kəndə gəzməyə gedək (maşınla); He took me out for a drive O məni maşınla gəzintiyə apardı;* 3. qovma; təqib etmə, izləmə *(düşməni, ovu və s.)*; 4. *hərb.* hücum; zərbə; 5. tələsmə, qaçaqaç, qaç-qov; the constant ~ of work işdə daim tələsmə/qaçaqaç; armament(s) ~ sürətlə silahlanma; 6. *amer.* kampaniya *(ictimai)*; ~ for signatures imza toplamaq üçün kampaniya; ~ to raise funds vəsait toplamaq üçün kampaniya; to put on a ~ kampaniya başlamaq; 7. bir arzunu / istəyi təmin etmə; meyl; a strong sexual ~ cinsi əlaqəyə meyl, cinsi əlaqə istəyi; 8. *tex.* ötürücü *(fırlanma hərəkətini bir yerdən o biri yerə ötürən mexanizm)*; front-/rear-/four-wheel ~ qabaq/arxa/ dörd təkər ötürücü; a car with left-hand ~ sükanı/rulu solda olan maşın

**drive**[2] [draıv] *v* (*pt* drove [drouv]; *pp* driven ['drıvn]) 1. sürmək, idarə etmək; to ~ a car / a tram, etc. maşın / tramvay və s. sürmək; to learn to ~ maşın sürməyi öyrənmək; *Can you drive? Sən / Siz maşın sürə bilirsən / bilirsiniz?; He drives a taxi O, taksi sürür; I drive to work Mən işə maşınla gedirəm; Could you drive me home? Sən / Siz məni evə maşınla apara bilərdinmi / bilərdinizmi;* 2. sürmək *(mal-qaranı çölə)*; to ~ cattle mal-qaranı çölə sürmək, mal-qaranı örüşə aparmaq; 3. qovmaq; çıxarmaq; to ~ the clouds buludları qovmaq; *His words drove all doubts from my mind Onun sözləri bütün şübhələri mənim fikrimdən qovdu / çıxartdı;* 4. bərk qaçmaq, sürətlə getmək; çaparaq getmək; qaçmaq; to ~ into the room qaçaraq evə soxulmaq; *He drove rudely past the girl into the room O, qızı kobudcasına itələyib otağa soxuldu;* 5. vurmaq, çalmaq, mıxlamaq; to ~ a wedge paz çalmaq; to ~ a nail home / to the head 1) mıxı axıra qədər çalmaq / vurmaq; 2) işi sona / axıra çatdırmaq; işi qaydaya salmaq; 6. *d.d.* uzatmaq; to ~ *smth.* to the last minute bir şeyi son dəqiqəyə qədər uzatmaq; 7. izləmək, dalınca düşmək, qovlamaq *(vəhşi heyvanı)*; to ~ game ov quşunu izləmək, ov quşunun dalınca düşmək / getmək; to ~ the invaders across the border istilaçıları ölkənin sərhədlərindən qovub çıxartmaq, istilaçıları ölkədən qovmaq; 8. etmək, aparmaq *(iş və s. haq.)*; to ~ a trade ticarət etmək; 9. çəkmək, tikmək, salmaq *(yol və s.)*; to ~ a railroad dəmir yolu çəkmək; to ~ away qovmaq, göndərmək, özündən uzaqlaşdırmaq; to ~ away care qayğını özündən uzaqlaşdırmaq; to ~ back geri qayıtmaq *(miniklə)*; to ~ in içəri salmaq/ qovmaq; to ~ in the cows inəkləri içəri salmaq; to ~ up sürüb yaxınlaşmaq; to ~ up to the door sürüb qapıya yaxınlaşmaq;

◊ to ~ a quill/a pen yazmaq, yazıçı olmaq; to ~ *smb.* to the wall bir kəsi divara dirəmək; to ~ a wedge between *smb.* and *smb.* iki nəfərin arasına təfriqə salmaq

**drivel**[1] ['drıvl] *n* cəfəngiyat, boşboğazlıq, boş söhbət / danışıq; sayıqlama

**drivel**[2] ['drıvl] *v* (-ll-) (on, about) boş-boş/gic-gic danışmaq; sayıqlamaq; *He was drivelling on / about the meaning of life O, həyatın mənası haqqında boş-boş danışırdı*

**driven** ['drıvn] to drive *felinin pp forması*

**driver** ['draıvə'] *n* 1. sürücü, şofer; a bus / taxi ~ avtobus / taksi sürücüsü; a tram ~ tramvay sürücüsü; 2. arabaçı, faytonçu; 3. *id.* qolf ağacı; 4. *tex.* operator; crane ~ kranşı *(kranı idarə edən fəhlə)*; 5. *tex.* motor, mühərrik

**driving**[1] ['draıvıŋ] *n* 1. gəzmə, gəzdirmə *(miniklə)*; 2. idarə etmə, sürmə *(maşını)*; *Careless driving costs life Diqqətsiz maşın sürmə həyat bahasına başa gəlir;* 3. *dən.* dreyf *(gəminin külək və ya axının təsirilə yolundan kənara çıxması)*

**driving**[2] ['draıvıŋ] *adj* 1. qovan, qovub aparan; 2. coşğun, şiddətli; hərəkətə gətirən; ~ age coşğun/sürətli inkişaf əsri; ~ storm qasırğa; ~ rain şiddətli yağış

**drizzle**[1] ['drızl] *n* xırda/ narın yağış, çiskin

**drizzle**[2] ['drızl] *v* çisəmək, çiskinləmək, narın



/xırda yağmaq *(yağış haq.)*; *The rain drizzled Narın yağış yağdı; It often drizzles in Autumn Payızda tez-tez çisələyir; It had been drizzling all day long yesterday Dünən bütün günü narın-narın yağış yağıb*

**drizzly** ['drızlı] *adj* çisəkli, çiskin; a ~ autumn morning çiskin bir payız səhəri; *It was a drizzly autumn morning Çiskin bir payız səhəri idi;* a cool, ~ day sərin çisəkli /çiskin/bir gün; *It was a drizzly and cold day when I arrived in London Mən Londona çatanda çiskinli və soyuq bir gün idi*

**droll**[1] [droul] *n* zarafatçı/masqaraçı/ məzəli adam, təlxək, oyunbaz; to play the ~ təlxəklik / hoqqabazlıq etmək

**droll**[2] [droul] *adj* zarafatçı, masqaraçı, məzəli; gülməli; a ~ person zarafatçı/məzəli adam; a ~ story məzəli / gülməli əhvalat

**droll**[3] [droul] *v d.d.* 1. zarafat/hənək etmək; gic-gic zarafat/şitlik/təlxəklik/oyunbazlıq etmək, oyun çıxartmaq; 2. (with, at, on) ələ salmaq, lağa qoymaq, oynatmaq, masqaraya qoymaq, gülmək, gülünc vəziyyətə salmaq

**drollery** ['droulərı] *n* 1. zarafat, hənək; nadinclik, hənəklik; təlxəklik; oyunbazlıq, hoqqabazlıq; 2. gülməli / məzəli əhvalat

**drolliness** ['droulınıs] *n* zarafatçılıq, məzəlilik, gülməlilik; təlxəklik

**drolly** ['droulı] *adv* zarafatla, zarafatyana, məzəli, məzəli-məzəli, gülməli, gülməli-gülməli

**dromedary** ['drʌmədərı] *n zool.* birgüvənli / birhürgüclü dəvə, donqar dəvə

**drone**[1] [droun] *n* I 1. erkək arı; 2. müftəxor, tüfeyli, tənbəl

**drone** [droun] *n* II 1. vızıltı; the ~ of bees arıların vızıltısı; 2. uğultu, uğuldama; the ~ of an aircraft/motor təyyarənin /motorun uğultusu; 3. *mus.* bas truba; valınka *(tuluq zurnası)*

**drone**[2] [droun] *v* I 1. boş-bikar gəzmək, heç bir iş görməmək, tənbəllik etmək, veyllənmək, avara gəzmək; özgənin hesabına yaşamaq; 2. məqsədsiz xərcləmək, israf etmək *(həm də to ~ away, to ~ out)*

**drone** [droun] *v* II 1. vızıldamaq, uğuldamaq *(arı və s. haq.)*; 2. yeknəsəq tərzdə oxumaq/danışmaq/mahnı oxumaq; deyinmək, donquldanmaq, mızıldamaq *(həm də to ~ out)*

**droningly** ['drounıŋlı] *adv* yeknəsəq, yeknəsəq bir halda, bir cür, usandırıcı bir şəkildə

**droop**[1] [dru:p] *n* 1. maillik, meyl; eniş; enmə, aşağı düşmə /salma; alçaltma, alçalma; 2. bir az beli büküklük, çiyinləri çıxma; to walk with a ~ belini bir az əyərək yerimək / gəzmək

**droop**[2] [dru:p] *v* (-pp-) 1. əyilmək, sallanmaq; *The branches drooped over the water Budaqlar suyun üstünə sallanmışdı/ əyilmişdi;* 2. solmaq, soluxmaq; to ~ from drought susuzluqdan/quraqlıqdan solmaq; 3. məyus olmaq, ruhdan/həvəsdən düşmək; 4. aşağı salmaq/sallamaq; to ~ *one's* head başını aşağı salmaq/sallamaq; 5. arıqlamaq, zəifləmək; 6. qüvvədən/haldan düşmək; yorulmaq, əldən düşmək; to ~ in the heat istidən haldan / əldən düşmək

**droopingly** ['dru:pıŋlı] *adv* çox yorğun, əldən düşmüş/üzülmüş/zəifləmiş halda, haldan düşmüş vəziyyətdə; zəif, halsız, taqətsiz

**droopy** ['dru:pı] *adj* 1. sallaq; *He had a long droopy moustache Onun uzun sallaq bığı vardı;* 2. ruhdan / həvəsdən düşmüş, məyus

**drop**[1] [drɔp] *n* 1. damcı; ~ of rain yağış damcısı; ~ of dew şeh damcısı; ~ by ~ damcı-damcı; to drink to the last ~ son damcıya qədər içmək; 2. udum, qurtum; ~ of tea bir qurtum çay; ~ of water bir qurtum su; 3. draje *(içi likörlü və ya şərbətli xırda konfet)*; chocolate ~s şokolad drajeləri; 4. bir udum / qurtum spirtli içki; to take *one's* ~ içmək *(spirtli içki)*; to have / to take a ~ too much artıq içmək; keflənmək, sərxoş olmaq; *I haven't touched a drop all day Bütün günü ağzıma bir qurtum da spirtli içki dəyməyib;* 5. sırğa, tana; 6. enmə, aşağı enmə / düşmə *(qiymət haq.)*; a great ~ in prices qiymətlərin xeyli aşağı düşməsi; a ~ in temperature temperaturun qəfildən aşağı enməsi / düşməsi;

◊ a ~ in the ocean okeanda /dənizdə bir damcı *(yəni çox az)*; at the ~ of a hat təxirə salmadan, dərhal, o saat

**drop**[2] [drɔp] *v* (-pp-) 1. damcılamaq, damcı-damcı axmaq; to ~ from the tree ağacdan damcılamaq; *Sweat dropped from his forehead Tər onun alnından damcılayırdı; The water dropped down slowly Su yavaş-yavaş damcılayırdı; The rain dropped Yağış damcıladı;* 2. düşmək; *The plate dropped out of his hand Boşqab onun əlindən düşdü;* 3. yıxılmaq; *The child dropped from the tree Uşaq ağacdan yıxıldı;* 4. salmaq, əldən salmaq; to ~ a pen/a book / a pencil, etc. qələmi / kitabı / karandaşı və s. əldən salmaq; to ~ the curtain 1) pərdəni endirmək / aşağı salmaq; 2) *məc.* hekayəni/tamaşanı qurtarmaq, nöqtə qoymaq; to ~ the rains *məc.* taleyin ixtiyarına / ümidinə vermək; to ~ anchor lövbər salmaq; 5. vurub salmaq / yıxmaq; to ~ a bird quşu vurub salmaq; 6. ölmək, qırılmaq *(həm də to ~ off)*; *He dropped off peacefully in his sleep O, yatarkən sakitcə öldü; Men dropped like flies İnsanlar milçək kimi qırılırdı/qırıldı;* 7. alçaltmaq, alçalmaq; to ~ *one's* voice səsini alçaltmaq; 8. göndərmək; to ~ *smb.* a note bir kəsə kağız/ məktub göndərmək; 9. dayandırmaq, kəsmək; to ~ *one's* studies təhsilini dayandırmaq; to ~ smoking; papirosu atmaq; *Drop it! Bəsdir! Dayan!;* 10. salmaq; to ~ a letter məktubu salmaq *(poçt qutusuna)*; 11. çıxartmaq *(siyahıdan, məktəbdən)*;

◊ to ~ out of *smb.'s* sight bir kəsin gözündən itmək

**dropper** ['drɔpə^r] *n* damcısalan, damcıtökən, pipet
**dropping-bottle** ['drɔpıŋ.bɔtl] *n* damcısalan
**droppings** ['drɔpıŋz] *n* qığ; heyvanların nəcisi
**drop-seat** ['drɔpsı:t] *n* qatlanan/ açılan oturacaq
**dropsy** ['drɔpsı] *n tib.* vadyanka, hidropos *(bədənin boşluqlarına su yığılması nəticəsində əmələ gələn xəstəlik)*
**drop-table** ['drɔp.teıbl] *n* açılıb-yığılan stol
**drought** [draut] *n* quraqlıq; **absolute ~** tam quraqlıq; *The crops died during the drought Quraqlıq dövründə məhsul məhv oldu*
**drought-resistant** ['drautrı'zıstənt] *adj k.t.* quraqlığadavamlı; **~ plants** quraqlığadavamlı bitkilər
**drove**[1] [drouv] *n* 1. naxır, sürü; ilxı; **~ of cattle** mal-qara naxırı; **~ of sheep** qoyun sürüsü; **~ of horses** at ilxısı; 2. yığın, dəstə, izdiham, camaat; **~s of watermelon** bir yığın qarpız; **~s of workers** bir dəstə fəhlə
**drove**[2] [drouv] *v* 1. mal-qaranı / qoyun-keçini bazara sürmək; 2. mal-qara/qoyun-keçi alveri etmək
**drove**[3] [drouv] **to drive** *felinin pt forması*
**drover** ['drouvə^r] *n* mal-qaranı/qoyun-keçini bazara sürən / aparan
**drown** [draun] *v* 1. batmaq, boğulmaq, qərq olmaq *(suda)*; 2. batırmaq; qərq etmək *(suda)*; **to be ~ed** batmaq, boğulmaq *(suda)*; 3. basmaq *(su haq.)*; **streets and houses ~ed by the floods** sel basmış küçələr və evlər; 4. **(out)** batırmaq *(səs haq.)*; *The band drowned out our conversation Orkestr bizim söhbətimizi batırdı (yəni eşidilməz etdi)*; **to ~ one's sorrows** qəmkədərini dağıtmaq; **to ~ one's grief in wine** dərdini şərab içməklə dağıtmaq
**drowning** ['drauniŋ] *adj* batan; boğulan *(suda)*; **a ~ man/ child** batan adam / uşaq;
◊ *A drowning man catches at a straw, A drowning man will catch at a straw at. söz. Suda batan/boğulan adam saman çöpündən yapışar*
**drowse**[1] [drauz] *n* 1. mürgü; huş; 2. yuxuculluq, mürgüləmə, daim mürgüləmə
**drowse**[2] [drauz] *v* 1. mürgüləmək, yuxulu olmaq; 2. xəyala/xülyaya qapılmaq; xəyal etmək; **to ~ the days away** günlərini şirin xəyala dalmaqla keçirmək, günlərini xəyallar aləmində keçirmək
**drowsily** [drauzılı] *adv* yuxulu-yuxulu, mürgülü bir tərzdə; **to murmur** ***smth.*** **~** bir şeyi yuxulu-yuxulu demək
**drowsiness** ['drauzınıs] *n* mürgü, yuxuculluq; əzginlik, süstlük
**drowsy** [drauzı] *adj* **(-ier, -iest)** 1. mürgüləyən, yuxulu; yuxucul; süst, daim mürgüləyən; *I'd just woken up and was still drowsy Mən yuxudan yenicə oyanmışdım və hələ də yuxulu idim*; 2. yuxugətirən; **~ summer weather** yuxugətirən yay havası; *This drug can make you drowsy Bu dərman sənə / sizə yuxu gətirə bilər*
**drub**[1] [drʌb] *n* dəyənəklə vurulan zərbə
**drub**[2] [drʌb] *v* **(-bb-)** 1. kötəkləmək, dəyənəklə döymək, döyəcləmək; **to ~ smb. to death** bir kəsi dəyənəklə ölüncə / ölənə qədər döymək; 2. **(into)** yeritmək; **to ~ an idea into smb.'s head** bir fikri bir kəsin başına yeritmək; 3. **(out of)** çıxartmaq; **to ~ an idea out of smb.'s head** bir fikri bir kəsin başından çıxartmaq; 4. məğlub/darmadağın etmək; 5. ayaqlarını yerə vurmaq, ayaq döymək, ayağı ilə tappıldatmaq; 6. söymək, yamanlamaq, söyüb biabır etmək
**drubbing** ['drʌbıŋ] *n* 1. döymə, əzişdirmə, kötəkləmə; 2. *d.d.* məğlubiyyət; **to take a ~** məğlub olmaq
**drudge**[1] [drʌdʒ] *n* çalışqan / işlək adam;
**drudge**[2] [drʌdʒ] *v* ağır iş görmək, ağır işlə məşğul olmaq; cansıxıcı/darıxdırıcı / zəhlətökən iş görmək; **to ~ at a dictionary-making** lüğət tərtibi üzərində əlləşmək
**drudgingly** ['drʌdʒıŋlı] *adv* səylə, cidd-cəhdlə, qeyrətlə
**drug**[1] [drʌg] *n* I 1. dərman, dava; **a pain-killing ~** ağrıkəsən dərman; 2. narkotik *(xəstəni huşsuzlaşdırmaq və yatırmaq üçün ona verilən zəhərli maddə)*; **narcotic ~s** narkotik maddələr; **to use ~s** narkotik maddələrdən istifadə etmək; **to take ~s** narkotik maddələr qəbul etmək
**drug** [drʌg] *n* II taxta-şalban / ağac daşıyan *(gəmi, avtomobil, vaqon və s.)*
**drug**[2] [drʌg] *adj* narkotik; **~ plant** narkotik bitki; **~ habit** narkomaniya; **~ addict** narkoman
**drug**[3] [drʌg] *v* 1. narkotik maddələr və ya zəhər qatmaq; 2. narkotik maddələr vermək; 3. narkotik maddələr qəbul etmək, narkoman olmaq
**druggist** ['drʌgıst] *n* 1. *amer.* baqqal; 2. əczaçı
**drugstore** ['drʌgstɔ:^r] *n* 1. aptek mağazası *(səhiyyə və sanitariya malları satan mağaza)*; 2. *amer.* dərman, kosmetik mallar, dondurma, kofe və s. satan mağaza
**drum**[1] [drʌm] *n* 1. baraban, təbil; **bass ~** *mus.* böyük baraban; **side /snare ~** balaca baraban *(musiqi aləti)*; **to beat / to play the ~** baraban / təbil çalmaq; 2. baraban / təbil səsi; 3. *hərb.* təbilçi, təbilçalan; 4. *zool.* səsçıxaran balıq; 5. *tex.* baraban *(müxtəlif maşınların və mexanizmlərin silindrşəkilli hissəsi)*
**drum**[2] [drʌm] *v* **(-mm-)** 1. baraban / təbil çalmaq; **to ~ a tune** hava çalmaq *(təbildə)*; 2. döymək, döyəcləmək; **to ~ (on) the table with one's fingers** barmaqlarılə stolu döyəcləmək; 3. vızıldamaq, uğuldamaq *(həşərat haq.)*; 4. **(into)** beyninə yeritmək; **to ~ Latin into smb. / into smb.'s head** latın dilini bir kəsin beyninə yeritmək; *Our teacher drummed multiplication tables into us till we knew them by heart Müəllimimiz vurma cədvəlini əzbər bilənə qədər onu bizim beynimizə yeritdi*



**drumbeat** ['drʌmbi:t] *n* təbil səsi
**drummer** ['drʌmə^r] *n* təbilçi, təbilçalan
**drumming** ['drʌmıŋ] *n* təbil səsi; titrək səs *(barabanda)*; **the steady ~ of the rain on the tin roof** dəmirlə örtülmüş dama yağışın aramsız döyəcləməsi
**drumstick**[1] ['drʌmstık] *n* 1. təbil ağacı *(təbil çalmaq üçün bir cüt ağac)*; 2. bişirilmiş toyuğun/hinduşkanın qıçının aşağı hissəsi
**drunk**[1] [drʌŋk] *adj* 1. kefli, sərxoş; **to get ~** keflənmək, sərxoş olmaq; *They put vodka in the girl's fruit juice to get her drunk Onlar qızı kefləndirmək üçün onun içdiyi meyvə şirəsinə araq qatdılar*; 2. məst, sərxoş, məst/sərxoş olmuş, sərxoş, sərxoş olmuş; **~ with success** müvəffəqiyyətdən məst olmuş; **~ with happiness** xoşbəxtlikdən məst/sərxoş olmuş
**drunk**[2] [drʌŋk] **to drink** *felinin pt forması*
**drunkard** ['drʌŋkəd] *n* əyyaş, içki düşkünü; alkoqolik
**drunken** ['drʌŋkən] *adj* 1. kefli, sərxoş; məst; içmiş *(spirtli içki)*; **a ~ man** kefli / sərxoş kişi; **a ~ sailor** kefli/sərxoş dənizçi; 2. sərxoş / kefli halda; **~ driving** kefli /sərxoş halda maşın sürmə; **~ frolic** içkinin yaratdığı şən əhval; **~ brawl** kefli / sərxoş halda qalmaqal salma; **~ sleep** sərxoşluqdan yatma
**drunkenness** ['drʌŋkənıs] *n* keflilik, sərxoşluq; məstlik
**drunkometer** [drʌŋ'koumi:tə^r] *n* kefliliyin / sərxoşluğun dərəcəsini ölçən cihaz
**dry**[1] [draı] *adj* **(drier; driest)** 1. quru; **~ bread** quru çörək; **~ clothing** quru paltar; **~ ice** quru buz; **~ battery** quru elektrik batareyası; **~ cough** *tib.* quru öskürək; 2. quraqlıq; quraq; **~ year** quraqlıq il; **~ summer** quraq yay; 3. qurumuş; susuz, suyu olmayan; **a ~ lake** qurumuş göl; **~ well** suyu olmayan / qurumuş quyu; **~ brook** suyu qurumuş kiçik çay; **to run ~** 1) qurumaq; 2) tükənmək, qurtarmaq; 4. *məc.* quru, soyuq, təmkinli, səbirli; **~ answer** quru / soyuq / təmkinli cavab; **~ thanks** soyuq/quru təşəkkür; 5. maraqsız, cansıxan, üröksıxan, darıxdırıcı; **~ book / speech /lecture, etc.** maraqsız kitab / nitq /mühazirə və s.; 6. turş, şəkər qatılmamış; **~ wine** turş şərab / çaxır
**dry**[2] [draı] *v (pt, pp* **dried***)* 1. qurutmaq; **to ~ clothes by the fire** paltarları ocağın yanında qurutmaq; **to ~ smth. in the wind** bir şeyi küləkdə qurutmaq; *The long drought dried up all the wells Uzunsürən quraqlıq bütün quyuları qurutdu*; 2. qurulamaq; *Dry your wet hands Yaş əllərini / əllərinizi qurut/qurudun*; 3. qurumaq; *The wet clothes will soon dry (out) in the sun Yaş paltarlar tezliklə günəşdə quruyacaq; Leave the dishes to dry (off) Qoy / Qoyun qablar qurusun*
**dry-clean** ['draı'kli:n] *v* kimyəvi üsulla təmizləmək
**dry-cleaner** ['draı'kli:nə^r] *n* 1. kimyəvi təmizləmə emalatxanasının sahibi; 2. kimyəvi təmizləmə emalatxanası işçisi; 3. kimyəvi təmizləmə üçün dərman
**dry-cleaner's** ['draı'kli:nəz] *n* kimyəvi təmizləmə *(emalatxanası)*
**dry-cleaning** ['draı'kli:nıŋ] *n* kimyəvi təmizləmə *(proses)*
**dryer** ['draıə^r] *n* 1. quruducu *(meyvə və s.)*, qurutma mütəxəssisi; 2. quruducu cihaz; meyvə və s. qurudulan yer / bina
**dry-goods** ['draı'gudz] *n* 1. *amer.* parça, arşın malı; 2. qalantereya, xırdavat
**dryish** ['draııʃ] *adj* qurutəhər, yarımquru, bir az qurumuş
**dryly** ['draılı] *adv* quru; soyuq
**dryness** ['draınıs] *n* quruluq; susuzluq
**dual** ['dju:əl] *adj* 1. iki, ikiqat; **~ citizenship** iki vətəndaşlıq; *He has dual citizenship Onun iki vətəndaşlığı var*; 2. ikitərəfli, ikili; **to have ~ character** ikili xüsusiyyətə malik omlaq; *The participle as well as the gerund has dual character Feli sifət, cerund kimi ikili xüsusiyyətə malikdir*
**dualism** ['dju:əlızəm] *n fəls.* dualizm *(materiya ilə şüuru, varlıqla təfəkkürü, təbiətlə ruhu bir-birindən asılı olmayan iki əsas hesab edən fəlsəfi cərəyan)*
**dualist** ['dju:əlıst] *n* dualist *(dualizm tərəfdarı)*
**dualistic** [.dju:ə'lıstık] *adj fəls.* dualist; **~ outlook** dualist dünyagörüşü/dünyabaxışı
**duality** [.dju:'ælıtı] *n* 1. ikilik; iki tərəfə meyl etmə; 2. dağınıqlıq; pərakəndəlik
**dualize, -ise** ['dju:əlaız] *v* haçalamaq, aralamaq, ikiyə ayırmaq / bölmək
**dub** [dʌb] *v* **(-bb-)** dublyaj etmək *(kinofilmi)*; **to ~ a film** filmi dublyaj etmək; **a German film ~bed into English** ingilis dilinə dublyaj edilmiş alman filmi
**dubious** ['dju:bjəs] *adj* 1. şübhəli, ikimənalı, aydın /aşkar olmayan; **~ answer** ikimənalı cavab; 2. həll olunmamış/edilməmiş, sual altında olan; **~ battle** sonu məlum olmayan döyüş/vuruş; 3. şübhələnən, tərəddüd edən; **~ of / about smb.'s honesty** bir kəsin namuslu/vicdanlı olmasına şübhələnən
**dubiously** ['dju:bjəslı] *adv* şübhəli, şübhə ilə, şübhə doğuracaq bir tərzdə; ikimənalı
**dubiousness** ['dju:bjəsnıs] *n* şübhəlilik, ikimənalılıq
**dubitable** ['dju:bıtəbl] *adj* şübhəli, mübahisəli; şübhədoğuran, mübahisədoğuran
**dubitate** ['dju:bıteıt] *v* şübhələnmək, şübhə etmək; tərəddüd etmək
**duchess** ['dʌtʃıs] *n* hersoginya *(hersoq arvadı / qızı)*
**duck**[1] [dʌk] *n* 1. *zool.* ördək; **the sound of ~s** ördəklərin səsi; 2. yaşılbaş, erkək ördək; 3. ördək əti; **roast ~** qızardılmış ördək *(əti)*
**duck**[2] [dʌk] *v* 1. baş vurmaq, cummaq, dalmaq

*(suya);* 2. batırmaq, basmaq *(suya); He ducked his head in the water to get cool O, başını suya batırdı ki, sərinləsin; Her sisters ducked him in the river Onun bacıları onu çaya basdılar;* 3. əyilmək; aşağı əyilmək; özünü kənara çəkmək; başını qaçırmaq; **to ~ *one's* head** başını əymək; *I saw the gun and ducked under the table Mən tüfəngi gördüm və stolun altına əyildim; He ducked his head to avoid a low branch O, başını əydi ki, başı alçaq budağa dəyməsin;* 4. cəld gizlənmək; *He saw a policeman coming, and ducked behind a car O, polis nəfərinin gəldiyini görərkən cəld bir maşının dalında gizləndi*

**duct** [dʌkt] *n* **1.** borucuq, kapilyar *(ən kiçik qan damarı);* 2. *anat.* yol, axacaq, kanal *(öd kanalı);* **the bile ~** öd axacağı / yolu / kanalı; 3. *tex.* boru kəməri, boru; **a heating ~** istilik / qızdırıcı kəmər

**dud** [dʌd] *adj* yararsız, lazımsız, gərəksiz; səmərəsiz, əbəs, nəticəsiz

**due¹** [dju:] *n* **1.** haqq *(işinə, əməlinə görə);* **to give *smb.* his ~** bir kəsə haqqını vermək; *She's a slow worker, but to give her due, she does try very hard O, astatərpənən işçidir, amma haqqına danışsaq, o, əlindən gələni edir / ciddi çalışır;* **to get *one's* ~** haqqını almaq, əməlinə görə haqqını almaq; *He received a large reward, which was no more than his due O, böyük mükafat aldı, bu ən azı onun haqqı idi;* 2. *pl* vergi, rüsum; **harbour ~s** liman rüsumu; 3. üzvlük haqqı *(partiya və ya həmkarlar təşkilatının);* **to pay *one's* ~s** üzvlük haqqını vermək

**due²** [dju:] *adj* **1.** lazımi; uyğun, uyğun gələn / olan, müvafiq, müvafiq olan, münasib, mütabiq; **in ~ course** öz qaydası ilə; **in ~ time** öz vaxtında, lazımi vaxtda; **in ~ form** lazımi /müvafiq / münasib formada; **with ~ respect** lazımi hörmətlə; 2. borclu, -malı, -məli; *He is due at his office on Monday O, bazar ertəsi ofisində olmalıdır; He is due to speak O, danışmalıdır / çıxış etməlidir;* 3. gözlənilən; *The mail is due tomorrow Poçt sabah gözlənilir, Poçt sabah gəlməlidir; The train is due at 8 o'clock Qatar saat 8-də gəlməlidir;* 4. layiq, layiqli, layiq olan; **~ penalty** layiqli cəza; **~ respect** lazımi hörmət göstərmə

**due³** [dju:] *adv* düz; birbaşa *(cəhətlərin adları qarşısında: şərq, qərb, şimal, cənub işlədilir);* **to go ~ east** düz şərqə getmək; **to sail ~ north** düz/birbaşa şimala üzmək *(gəmi ilə)*

**duel¹** ['dju:əl] *n* **1.** duel *(zadəgan-burjua cəmiyyətində müəyyən şərtlərlə iki nəfərin bir-birilə vuruşması və ya atışması);* **to fight a ~** duelə çıxmaq; **to challenge *smb.* to a ~** bir kəsi duelə çağırmaq; 2. yarış, mübarizə; təkbətək vuruşma/döyüş; 3. mübahisə, bəhs; **to engage in a ~ of words** söz güləşdirmək; cəhl çəkmək/ etmək

**duel²** ['dju:əl] *v* dueldə vuruşmaq, duelə çıxmaq

**dueller** ['dju:ələ<sup></sup>ʳ] *n* = **duellist**

**duellist** [dju:əlɪst] *n* duelçi *(dueldə iştirak edən adam)*

**duet** [dju:'et, du:'et] *n mus.* duet *(ikilikdə oxunan nəğmə və ya çalınan hava);* **a ~ for violin and piano** skripka və piano üçün duet; *We sang a duet Biz bir duet oxuduq*

**due to** ['dju: tu:] *prep* görə, səbəbindən, ucbatından, nəticəsi olaraq; *His illness was due to bad food Onun xəstəliyi keyfiyyətsiz / pis ərzağa görə idi; His death was due to pneumonia Onun ölümünə səbəb sətəlcəm oldu*

**duettist** [dju:'etɪst] *n* duet oxuyan, duet oxuyanlardan biri

**duff** [dʌf] *adj* yaramaz, yararsız; lazım olmayan; **a ~ radio** yararsız radio; *He sold me a duff radio O mənə bir işləməyən radio satdı*

**duffer** ['dʌfəʳ] *n* küt, key, heç nə bacarmayan *(adam); I was always a bit duffer at maths Mən həmişə riyaziyyatdan bir az küt / zəif olmuşam*

**dug¹** [dʌg] *n* **1.** məmə, əmcək *(heyvanlarda);* 2. yelin

**dug²** [dʌg] **to dig** *felinin pt, pp forması*

**dug-out¹** ['dʌgaut] *n* **1.** qayıq *(bütöv bir ağac gövdəsindən oyma yolu ilə hazırlanmış);* 2. qazma, qazma dam; 3. *hərb.* blindaj, istehkam *(səngərdə top gülləsindən qorunmaq üçün sipər),* sığınacaq

**dug-out²** ['dʌg'aut] *adj* **1.** qazılmış, qazıq-qazıq edilmiş / olmuş; 2. oyulmuş, oyulub qayrılmış / düzəldilmiş

**duke** [dju:k] *n* hersoq *(Qərbi Avropada yüksək zadəgan rütbələrindən biri)*

**dukedom** ['dju:kdəm] *n* **1.** hersoq titulu; 2. hersoqluq

**dukery** ['dju:kərɪ] *n* hersoqun iqamətgahı və ya malikanəsi

**dulcet** ['dʌlsɪt] *adj şair.* zərif, könüloxşayan, ürəyəyatan; **~ voice** zərif/ürəyəyatan səs

**dulcify** ['dʌlsɪfaɪ] *v* **1.** yumşaltmaq, zərifləşdirmək, yumşaq etmək; 2. şirinləşdirmək

**dulcimer** ['dʌlsɪməʳ] *n* simbal *(üzərində simlər olan qutuşəkilli musiqi aləti)*

**dull¹** [dʌl] *adj* (-er; -est) **1.** küt, korazehin, anlamaz, qanmaz, kütbeyin, gecqanan, malbaş; **a ~ pupil** küt/kütbeyin/korazehin şagird; **a ~ ache** küt ağrı; 2. maraqsız, ürəksıxan, darıxdırıcı, usandırıcı, cansıxıcı; **a ~ book** maraqsız/darıxdırıcı/usandırıcı kitab; **a ~ lecture** maraqsız/usandırıcı/darıxdırıcı mühazirə; *The conference was deadly dull Konfrans çox maraqsız idi;* 3. tutqun; **a ~ colour** tutqun boya / rəng; **a ~ weather/day** tutqun hava / gün; 4. küt, iti olmayan; **a ~ knife** küt bıçaq; 5. zəif, pis; aydın olmayan; **~ hearing** zəif/pis eşitmə; **~ sight** zəif /pis görmə; 6. cansız, hissiz; 7. zəif, süst, ləng *(ticarət və s. haq.);* fəaliyyətsiz; ölü; **~ season** durğunluq dövrü *(ticarətdə, istehsalatda);*



◊ **as ~ as ditch water** dözülməz dərəcədə zəhlətökən /maraqsız

**dull²** [dʌl] *v* **1.** kütləşdirmək *(bıçağı, ağrını və s.); She took drugs to dull the pain Ağrını kütləşdirmək üçün o, dərman qəbul etdi;* 2. zəifləmək; korlamaq; **eyes and ears ~ed by age** yaşla əlaqədar zəifləmiş gözlər və qulaqlar

**dullard** ['dʌləd] *n* küt, korazehin, kütbeyin *(adam)*

**dullish** ['dʌlɪʃ] *adj* küttəhər, gictəhər, kütbeyin, korazehin

**dullness** ['dʌlnɪs] *n* kütlük, giclik, kütbeyinlik, korazehinlik

**dully** ['dʌlɪ] *adv* küt bir tərzdə/şəkildə; *His leg ached dully Onun ayaqlarında küt ağrı vardı*

**dulness** ['dʌlnɪs] *n* = **dullness**

**duly** ['dju:lɪ] *adv* **1.** lazımi, lazımi qaydada, lazım olduğu kimi; *I declare that Bill Clinton has been duly elected President of the United States Mən bəyan edirəm ki, Bill Klinton Amerika Birləşmiş Ştatlarının prezidentliyinə lazımi qaydada seçilmişdir;* 2. lazımi vaxtda, öz vaxtında; **to pay tax ~** vergini vaxtında vermək/ ödəmək; *The taxi that he had ordered duly arrived Onun sifariş etdiyi taksi vaxtında gəldi*

**duma** ['du:mə] *n* duma *(Rusiya parlamenti)*

**dumb** [dʌm] *adj* (-er, -est) **1.** lal; **~ from birth** anadangəlmə lal; **to be ~ from birth** anadangəlmə lal olmaq; *She's been dumb from birth O, anadangəlmə laldır;* 2. lal olmuş, dili / nitqi tutulmuş; **to be ~ with astonishment /surprise** heyrətdən / təəccübdən lal olmaq, heyrətdən/təəccübdən nitqi tutulmaq; **to strike ~** nitqini qurutmaq; danışa bilməmək; *The terrible news struck us all dumb Bu dəhşətli xəbər bizim hamımızın nitqini qurutdu;* 3. dilsiz-ağızsız; **~ animals** dilsiz/nitqsiz heyvanlar; 4. dinməz, danışmaz, dinməz-danışmaz, dinməz-söyləməz, sakit; 5. sirr saxlayan; *History is dumb on it Tarix bu barədə susur;* 6. danışmadan ifa edilən; **~ show** lal səhnə, pantomima *(mimika və hərəkətlərlə ifa edilən/olunan teatr tamaşası);* 7. *şair.* sakit, sükuta qərq olmuş; mürgüləyən, yatan; **~ forest** sükuta qərq olmuş meşə; **~ village** yatmış/sakit/sükuta qərq olmuş kənd; 8. səsçıxarmayan, səssiz; **~ notes** səs çıxartmayan klaviş/dil *(qarmonda, pianoda və s.);* 9. *amer. d.d.* axmaq, gic, sarsaq, qanmaz

**dumbly** ['dʌmlɪ] *adv* danışmadan, dinmədən, dinməzcə, dinməz-danışmaz; *She was staring dumbly into the fire O, danışmadan / dinmədən / dinməzcə gözlərini ocağa zilləmişdi*

**dumbness** ['dʌmnɪs] *n* **1.** lallıq; dilsizlik; 2. sükut, səssizlik, sakitlik, susma

**dummy¹** ['dʌmɪ] *n* **1.** kukla, müqəvva; maneken; **tailor's ~** dərzi manekeni; 2. butafor insan fiquras; 3. butaforiya; yalançı; *The bottles of whisky on display are all dummies Sərgiyə qoyulmuş viski butulkalarının hamısı butaforiyadır;* **a ~ gun made of wood** ağacdan/taxtadan qayrılmış yalançı tüfəng; *(həm də* **boy's ~***);* 4. əmzik, boş əmzik; süni düzəldilmiş şey; qoyma / qayırma diş və s.; 5. *hərb.* təlim patronu; 6. gic, küt, sarsaq, kütbeyin, başıboş *(adam);* 7. marionetka *(başqasının sözü ilə oturub duran adam);* 8. *id.* fənd, aldatma; **to give / to sell *smb.* the ~** bir kəsi aldatmaq, bir kəsin əlindən sıyrılıb çıxmaq, bir kəsə fənd gəlmək *(futbolda);* 9. *d.d.* yolgöstərən işarələr

**dummy²** ['dʌmɪ] *adj* **1.** qəlp, saxta, süni; qondarma; yalan; **~ watch** yalançı/oyuncaq saat; **~ cartridge** *hərb.* boş/təlim üçün patron; 2. lal; səssiz

**dump¹** [dʌmp] *n* **1.** cır-cındır/zir-zibil topası; zibil yığını/qalağı; 2. zibillik, zibilxana, zibil tökülən yer; 3. *hərb.* səyyar anbar; 4. *amer. jarq.* qumarxana, tiryəkxana; 5. həbsxana, qazamat; 6. küt zərbə, ağır bir şeyin düşməsi nəticəsində çıxan səs

**dump²** [dʌmp] *v* **1.** tökmək, yığmaq *(bir yerə);* 2. atmaq, boşaltmaq; **to ~ coal** kömür boşaltmaq; 3. bazarı ucuz mallarla doldurmaq

**dumper** ['dʌmpəʳ] *n (həm də* **dumper truck**, *amer.* **dump truck***)* yükünü özü boşaldan torpaq və s. daşımaq üçün vaqonet *(kiçik vaqon)*

**dumping** ['dʌmpɪŋ] *n* **1.** tökmə, boşaltma; bütünlüklə boşaltma; 2. boşaldılan şey; 3. dempinq *(rəqabət məqsədilə xarici bazarlara malların öz dəyərindən ucuz qiymətə satılması)*

**dumpy** ['dʌmpɪ] *adj (-***ier**; **-iest**) gödək və kök *(adam haq.)*

**dun¹** [dʌn] *n* bozumtul-şabalıdı bozumtul/palıdı rəng

**dun²** [dʌn] *adj* bozumtul palıdı / şabalıdı; **~ leather boots** bozumtul palıdı rəngli dəri çəkmə

**dunce** [dʌns] *n* **1.** key, küt, kütbeyin, korazehin, axmaq, sarsaq, səfeh *(xüs. oxuya bilməyən tələbə haq.);* **~'s cap** cəza olaraq oxuya bilməyən tələbəyə sinifdə geydirilən kağız papaq; 2. *tar.* sxolast *(əzbərçi),* sofist *(düzgün olmayan fikri sofizmlərlə sübut etməyə çalışan adam)*

**dunderhead** ['dʌndəhed] *n* başıboş/gic/küt/ qanmaz adam

**dung¹** [dʌŋ] *n* peyin; **cow ~** inək peyini; **to spread ~** peyin səpmək

**dung²** [dʌŋ] *v* peyinləmək *(torpağı),* peyin səpmək / vermək *(torpağa)*

**dung³** [dʌŋ] **to ding** *felinin pt, pp forması*

**dung-beetle** ['dʌŋ.bi:tl] *n* peyinqurdu

**dungeon¹** ['dʌndʒən] *n* zindan, yeraltı həbsxana / məhbəs *(xüs. qəsrlərdə);* **to throw *smb.* into the ~** bir kəsi zindana salmaq / atmaq

**dungeon²** ['dʌndʒən] *v* zindana atmaq/salmaq

**dung-fork** ['dʌŋfɔ:k] *n* peyin yabası

**dunghill** ['dʌŋhɪl] *n* peyin topası / yığını

**dunghill-cock** [ˈdʌŋhɪlˈkɔk] *n* ev xoruzu
**dunghill-hen** [ˈdʌŋhɪlˈhen] *n* ev toyuğu
**dung-spreader** [ˈdʌŋˈspredəʳ] *n k.t.* peyindağıdan, peyinsəpən *(yerə, torpağa)*
**dung-yard** [ˈdʌŋja:d] *n k.t.* peyin saxlanılan yer, peyinlik
**dunk** [dʌŋk] *v* batırmaq; basmaq *(suya); She always dunks her biscuits in her coffee O həmişə peçenyesini qəhvəyə batırır; They dunked the boy in the river as a joke Onlar zarafat olaraq oğlanı çaya basdılar*
**dunno** [dəˈnou] *v sl* = **do not know**: *Where is your father? I asked. "Dunno," he said "Atan /Atanız haradadır?" deyə mən soruşdum. "Bilmirəm," deyə o, cavab verdi*
**duologue** [ˈdjuəlɔg] *n* dialoq *(xüs. səhnədə)*
**duopoly** [dju:ˈɔpəlɪ] *n* iki rəqabət aparan kompaniyanın monopoliyası
**duostroller** [ˌdju:ouˈstrouləʳ] *n* əkizlər üçün uşaq arabası
**dupe[1]** [dju:p] *n* yalanın qurbanı; sadədil, sadəlövh, sadə *(adam)*: axmaq, sarsaq, maymaq, fərsiz, ağzıaçıq *(adam)*
**dupe[2]** [dju:p] *v* ələ salmaq, oynatmaq, aldatmaq, axmaq yerinə qoymaq
**dupeable** [ˈdju:pəbl] *adj* tezaldanan; sadəlövh, sadədil, avam
**dupery** [ˈdju:pərɪ] *n* aldatma, yalan, hiylə, kələk, fırıldaq
**duplicate[1]** [ˈdju:plɪkət] *n* **1.** surət; *Is this a duplicate or the original? Bu surətdir, yoxsa orijinal?*; 2. nüsxə; *You must prepare a contract in duplicate Sən/Siz müqaviləni iki nüsxədə hazırlamalısan/hazırlamalısınız;* 3. dublikat, kopiya *(sənədin, açarın və s.)*
**duplicate[2]** [ˈdju:plɪkɪt] *adj* **1.** tam uyğun/oxşar/bənzər; **a ~ set of keys** bir dəst/set/tam oxşar açar; 2. ehtiyat; **~ parts** ehtiyat hissələr
**duplicate[3]** [ˈdju:plɪkeɪt] *v* **1.** üzünü/surətini çıxartmaq; 2. iki dəfə artırmaq; **to ~ expenses** xərcləri iki dəfə artırmaq
**duplication** [ˌdju:plɪˈkeɪʃn] *n* **1.** təkrar etmə; təkrarlama, eyni işi təkrar görmə; 2. üzünü/surətini çıxartma; 3. dublikat, surət
**duplicator** [ˈdju:plɪkeɪtəʳ] *n tex.* surətçıxaran cihaz / aparat
**duplicity** [dju:ˈplɪsɪtɪ] *n* **1.** ikiüzlülük, riyakarlıq; 2. yalan, aldatma; 3. ikiqat artırılmış miqdar, ikiqat artırma
**durability** [ˌdjuərəˈbɪlɪtɪ] *n* **1.** dözüm, davamlılıq, möhkəmlik, dözümlülük; 2. uzunömürlülük, uzun müddət yaşama; 3. *tex.* möhkəmlik, davamlılıq, dağılmazlıq
**durable** [ˈdjuərəbl] *adj* **1.** möhkəm, davamlı, bərk, etibarlı; **~ cloth** möhkəm parça; **~ friendship** möhkəm/davamlı dostluq; **~ peace** möhkəm/etibarlı sülh; **trousers made of ~ material** möhkəm / davamlı parçadan tikilmiş şalvar; 2. uzunömürlü, uzun müddət yaşayan/ömür sürən; uzunsürən, uzunmüddətli
**duration** [djuˈreɪʃn] *n* müddət; davam, sürəklilik; **~ of human life** insan ömrünün / həyatının müddəti; **of short / long / three year's ~** qısa / uzun / üçillik müddət
**duress** [djuˈres] *n* hədə, qorxu, hədə-qorxu; məcburiyyət, məcbur etmə; **~ by menaces** ölüm hədəsilə məcbur etmə; **~ of goods** əmlakını qanunsuz həbs etmə; **to do *smth.* under ~** bir şeyi hədə-qorxu altında etmək
**during** [ˈdjuərɪŋ] *prep* ərzində, müddətində; **~ the whole week** bütün həftə ərzində; **~ last year** keçən il müddətində; *During his lifetime his work was never published Sağlığında onun əsəri heç vaxt çap olunmadı; They only met twice during the whole time they were neighbours Onlar qonşu olduqları bütün müddətdə cəmi iki dəfə görüşdülər*
**dusk[1]** [dʌsk] *n* toran, qaşqaralan vaxt, alaqaranlıq; **till ~** qaranlıq düşənə qədər; **in the ~** qaranlıqda, toranda
**dusk[2]** [dʌsk] *adj şair.* toran; qaranlıq; aydın / aşkar olmayan
**dusk[3]** [dʌsk] *v* toranlaşmaq, qaranlıq düşmək, toran qovuşmaq, qaş qaralmaq, qaranlıqlaşmaq
**duskiness** [ˈdʌskɪnɪs] *n* **1.** toran, toranlıq, alaqaranlıq; 2. əsmərlik, qarabuğdayılıq, qaralıq
**dusky** [ˈdʌskɪ] *adj* **(-ier, -iest) 1.** toran, qaranlıq, bir qədər tünd/tutqun; kölgəli; **~ cave** qaranlıq mağara; **~ vale** kölgəli dərə; 2. qara, qarabuğdayı, əsmər; tünd, tutqun; 3. düşkün; qəmli, qəmgin, həzin, qüssəli, dərdli, kədərli; melanxolik, qəmgətirən
**dust[1]** [dʌst] *n* **1.** toz; **fine ~** narın toz; **clouds of ~ blowing in the wind** havada fırlanan toz buludu; **chalk ~** tabaşir tozu; **radioactive ~** radioaktiv toz; **to raise the ~** toz qaldırmaq; *The dust settled Toz çökdü/yatdı; The furniture was covered in a thick layer of dust Mebeli qalın toz layı /qatı basmışdı;* 2. səs, səs-küy; qarışıqlıq, çaxnaşma, qaçaqaç; hay-küy, mərəkə; **to make / to raise / to kick up a ~** səs-küy / çaxnaşma/ mərəkə qaldırmaq; *məc.* toz qaldırmaq; *The dust settled məc. Ehtiraslar söndü;* 3. kül *(meyit yandırıldıqdan sonra qalan)*;
◊ **to lick the ~** yaltaqlanmaq, yaltaqlıq etmək, quyruq bulamaq; **to bite the ~** ölü kimi yıxılıb / düşüb qalmaq; **to take the ~** *amer.* dala qalmaq, quyruqda sürünmək; **to give the ~ to *smb.*** *amer.* bir kəsi qabaqlamaq / ötüb keçmək; **to throw ~ in *smb.'s* eyes/in the eyes of *smb.*** bir kəsin gözünə kül üfürmək, bir kəsi aldatmaq
**dust[2]** [dʌst] *v* **1.** silmək *(tozu)*, tozu çırpmaq; süpürmək, tozunu almaq *(həm də* **to ~ off***)*; **to ~ the furniture/books/room** mebelin/ kitabların / otağın tozunu almaq; 2. səpmək, üstünə səpmək, tökmək *(un, şəkər tozu)*; **to ~ a cake with sugar** tortun üstünə şəkər tozu səpmək; **to ~ a little pepper over *smth.*** bir şeyin üstünə bir az istiot səpmək; 3. toza bulamaq; toz eləmək, tozlandırmaq, toz qaldırmaq; **to ~ *one's* feet** ayaqlarını toza bulamaq; 4. *amer. d.d.* ötüb keçmək, arxada qoymaq, qabağa keçmək



**dust-bin** [ˈdʌstbɪn] *n* zibil qutusu / yeşiyi
**dust-cart** [ˈdʌstka:t] *n* zibil arabası, zibil daşıyan araba
**duster** [ˈdʌstəʳ] *n* silgi, toz silmək üçün cında
**dust-hole** [ˈdʌsthoul] *n* zibilxana, zibillik, zibil tökülən quyu/yer
**dustless** [ˈdʌstlɪs] *adj* qüsursuz, təmiz, tərtəmiz; bir dənə də tozu olmayan
**dustman** [ˈdʌstmən] *n (pl* **-men** [-mən]*)* zibilçi, zibildaşıyan, zibilyığan; tullantıyığan
**dust-pan** [ˈdʌstpæn] *n* xəkəndaz
**dust-proof** [ˈdʌstpru:f] *adj* tozkeçirməyən, tozburaxmayan
**dust-storm** [ˈdʌststɔ:m] *n* toz tufanı
**dust-up** [ˈdʌstˈʌp] *n d.d.* səs-küy, qalmaqal, hay-küy, vəlvələ, dava-dalaş; söyüşmə, deyişmə
**dusty** [ˈdʌstɪ] *adj* **(-ier, -iest) 1.** tozlu, toz basmış, toza bulanmış; **a ~ room /street /road** tozlu otaq/küçə/yol; *This room's awfully dusty Bu otaq dəhşətli dərəcədə tozludur;* 2. tozaoxşar, tozabənzər, tozrəngli; 3. quru; maraqsız
**dusty miller** [ˈdʌstɪˈmɪləʳ] *n bot.* peyğəmbərçiçəyi *(açıq göy rəngli çöl çiçəyi)*
**Dutch[1]** [dʌtʃ] *n* **1.** *(the ~) top. i* hollandiyalılar; 2. holland dili
**Dutch[2]** [dʌtʃ] *adj* Hollandiya, holland; **~ cheese** holland pendiri
**Dutchman** [ˈdʌtʃmən] *n (pl* **-men** [-mən] *adj* Hollandiyalı
**dutiful** [ˈdju:tɪfl] *adj* **1.** icraedici, icraçı; çox çalışqan, çox səyli; 2. itaətkar, sözəbaxan, sözə qulaq asan, üzüyola; **a ~ son** üzüyola / itaətkar / sözəbaxan oğul; **a ~ servant** itaətkar / sadiq xidmətçi
**duty** [ˈdju:tɪ] *n* **1.** vəzifə; borc, mənəvi borc; **to do *one's* ~** öz borcunu/vəzifəsini yerinə yetirmək; ***one's* ~ to *one's* country** vətəni qarşısında borcu; *It's your duty to do this Bunu etmək sənin/sizin vəzifəndir/vəzifənizdir.* 2. funksiya, vəzifə; **the duties of a soldier** əsgərin vəzifələri; **to do ~ for *smb.*, to take *smb.'s* ~** bir kəsin vəzifəsini yerinə yetirmək, bir kəsi əvəz etmək; **to take up / to enter upon *one's* duties** öz vəzifəsini icra etməyə başlamaq; 3. növbə, növbətçilik; **on ~** növbətçi; növbətçilik zamanı; vəzifə başında; **to be on ~** növbətçi olmaq, vəzifə başında olmaq; **to be off ~** növbətçi olmamaq, növbə çəkməmək; 4. hərbi mükəlləfiyyət; 5. vergi, rüsum, gömrük; gerb rüsumu *(sənədlərdən alınan dövlət rüsumu)*; **customs duties** gömrük rüsumları; **export / import duties** ixrac / idxal rüsumu; **to lay duties on *smth.*** bir şey üzərinə vergi qoymaq; 6. hörmət, ehtiram; **to pay *one's* ~ to *smb.*** bir kəsə hörmət etmək, bir kəsə ehtiram göstərmək
**duty-free** [ˈdju:tɪˈfri:] *adj* rüsum alınmayan, rüsumsuz
**duty-paid** [ˈdju:tɪpeɪd] *adj* rüsum alınmış, rüsumu verilmiş
**duvet** [ˈdu:veɪ] *n fr.* tük yorğan; **a single / double ~** biradamlıq/ikiadamlıq tük yorğan
**dwarf[1]** [dwɔ:f] *n (pl* **dwarfs** *və ya* **dwarves**) **1.** karlik *(kiçik boylu adam)*; 2. karlik bitki və ya heyvan; 3. cırtdan *(Qərbi Avropa nağıllarında)*
**dwarf[2]** [dwɔ:f] *adj* karlik, kiçikboylu; **~ oak** karlik palıd ağacı
**dwarf[3]** [dwɔ:f] *v* **1.** böyüməyə/boy atmağa mane olmaq; 2. boy atmaqdan qalmaq, inkişaf etməmək; 3. kiçiltmək, balaca göstərmək; *The big steamer dwarfed our little boat Nəhəng gəminin yanında bizim balaca qayığımız lap kiçildi/balaca göründü*
**dwarfish** [ˈdwɔ:fɪʃ] *adj* **1.** çox xırda / kiçik / balaca *(adam, heyvan, bitki haq.)*, cırtdan; 2. lazımınca inkişaf etməmiş, inkişafdan qalmış, qüsurlu *(inkişaf baxımından)*
**dwell** [dwel] *v (pt, pp* **dwelt** [dwelt]; *amer.* **dwelled**) **1.** yaşamaq, sakin olmaq; ömür/ həyat sürmək; **to ~ abroad /in the country** xaricdə / vətəndə yaşamaq; **to ~ in the cave /forest** mağarada /meşədə yaşamaq; 2. **(on, upon)** ətraflı dayanmaq *(bir məsələ, problem və s. üzərində)*; təfərrüata varmaq; *Let's not dwell on your last mistake Gəl/Gəlin sənin/sizin axırıncı səhvin / səhviniz üzərində ətraflı dayanmayaq*
**dweller** [ˈdweləʳ] *n* sakin, yaşayan, əhl; **town-~s** şəhər sakinləri; **cave ~s** mağarada yaşayanlar, mağara sakinləri; *These lions are forest-dwellers Bu şirlər meşədə yaşayır*
**dwelling** [ˈdwelɪŋ] *n* mənzil, ev; **humble ~** sadə / kasıb mənzil; *Welcome to my humble dwelling Mənim bu kasıb mənzilimə xoş gəlmisən / gəlmisiniz*
**dwelling-house** [ˈdwelɪŋhaus] *n* yaşayış evi
**dwelling-place** [ˈdwelɪŋpleɪs] *n* daimi yaşayış yeri
**dwelt** [dwelt] **to dwell** *felinin pt, pp forması*
**dwindle** [ˈdwɪndl] *v* **1.** azalmaq, əskilmək; tükənmək, sərf olunub qurtarmaq; ixtisar olunmaq *(həm də* **to ~ away**); *The number of people on the island is dwindling Adada adamların sayı azalır; Their savings have dwindled (away) to almost nothing Onların qənaət edib yığdıqları pul demək olar ki, faydasız sərf olunub qurtarıb/tükənib;* 2. azaltmaq, tükətmək; 3. pisləşmək, xarablaşmaq; ağırlaşmaq *(xəstəlik haq.)*
**dye[1]** [daɪ] *n* **1.** boya, boyaq, boyaq maddəsi; **blue/yellow/red/green ~** mavi/sarı/qırmızı/yaşıl boya; **synthetic ~** sintetik boya / boyaq maddəsi; 2. rəng; **rainbow ~s** göy qurşağının rəngləri; **blue ~** mavi rəng; **to take a ~** rəng / boya götürmək

ölkənin gerbi, dövlət gerbi; *A dove is an emblem of peace Göyərçin sülh simvoludur; A balance is an emblem of justice Tərəzi ədalət simvoludur*
**embodied** [ım'bɔdıd] *adj* 1. həyata keçirilmiş, təmsil/ifadə edilmiş, göstərilmiş; 2. *hərb.* təşkil edilmiş, düzəldilmiş, yaradılmış; 3. daxil edilmiş; **clauses ~ in the treaty** müqaviləyə daxil edilmiş maddələr; **~ in the armed forces** silahlı qüvvələrin tərkibinə daxil edilmiş
**embodiment** [ım'bɔdımənt] *n* təcəssüm, təcəssüm etdirmə
**embody** [ım'bɔdı] *v* 1. həyata keçirmək, reallaşdırmaq; 2. təcəssüm/əks etdirmək, ifadə etmək; simvolu olmaq *(bir şeyin)*; 3. tərkib hissəsi olmaq; 4. olmaq, ...vardır; **article that embodies the following regulation** tərkibində aşağıdakı müddəalar olan məqalə; 5. birləşdirmək
**emborder** [ım'bɔ:də[r]] *v* haşiyələmək, haşiyə çəkmək/vermək
**embosom** [ım'buzəm] *v* 1. əzizləmək, nazlamaq; 2. saxlamaq, gizləmək, gizli saxlamaq *(sinəsində, qəlbində)*; 3. qucaqlamaq, sinəsinə sıxmaq; 4. əhatə olunmaq; *A village was embosomed in/with hills Kənd təpələrlə əhatə olunmuşdu*
**emboss** [ım'bɔs] *v* basmaq, vurmaq, naxış basmaq/salmaq *(metala və s.)*
**embossment** [ım'bɔsmənt] *n* yapma, model /heykəl yapma, naxış *(metalda və s.)*, oyma, naxış *(ağac, sümük və s. üzərində)*; naxış basma, basmanaxış
**embrace[1]** [ım'breıs] *n* qucaq; **mother's ~** ana qucağı; **to hold smb. in one's ~** bir kəsi qucaqlamaq/qolları arasına almaq
**embrace[2]** [ım'breıs] *v* I 1. qucaqlamaq; sinəsinə sıxmaq; **to ~ smb** bir kəsi qucaqlamaq; *She embraced her son O, oğlunu qucaqladı*; 2. istifadə etmək; **to ~ an opportunity/an offer** imkandan/təklifdən istifadə etmək; 3. qəbul etmək; **to ~ a theory** nəzəriyyəni qəbul etmək; **to ~ a course of action** fəaliyyət proqramını qəbul etmək; **to ~ Christianity** xristianlığı qəbul etmək
**embrace** [ım'breıs] *v* II *hüq.* məhkəmə iclasçılarını/hakimləri ələ almağa cəhd etmək/çalışmaq
**embraceable** [ım'breısəbl] *adj* başdan çıxardan, şirnikdirici, cazibəli, cazibədar
**embracement** [ım'breısmənt] *n* qəbul etmə /edilmə; **the ~ of a doctrine** doktrinanın qəbul edilməsi
**embracer** [ım'breısə[r]] *n hüq. məhkəmə iclasçılarını/hakimi ələ almaqla təsir göstərməyə cəhd edən şəxs*
**embrasive** [ım'breısıv] *adj* mehriban, novazişli, iltifatlı
**embroider** [ım'brɔıdə[r]] *v* 1. naxış tikmək/ vermək; naxışla bəzəmək; 2. bəzəmək, şişirtmək *(hekayəni və s.)*; hadisəni mübaliğəli surətdə təsvir etmək
**embroiderer** [ım'brɔıdərə[r]] *n* naxışçı, naxıştikən
**embryo** ['embrıou] *n (pl* **-os** [-ouz]) 1. *biol.* rüşeym, embrion; 2. *məc.* başlanğıc halında olan inkişaf etməmiş rüşeym;
◊ **in ~** başlanğıc mərhələdə, inkişaf etməmiş; *My plans are still in embryo Mənim planlarım hələ başlanğıc mərhələdədir*
**embryologist** [,embrı'ɔlədʒıst] *n* embrioloq *(embriologiya mütəxəssisi)*
**embryology** [,embrı'ɔlədʒı] *n* embriologiya *(biologiyanın rüşeymlərin inkişafından bəhs edən şöbəsi)*
**embryonic** [,embrı'ɔnık] *adj* 1. embrioloji, embriologiya; 2. *məc.* başlanğıc, başlanğıc mərhələdə olan, inkişaf etməmiş; *The scheme is still in embryonic form /at an embryonic stage Layihə hələ başlanğıc formadadır/mərhələdədir*
**emend** [ı'mend] *v* düzəltmək *(mətni)*; səhvləri/nöqsanları aradan qaldırmaq; düzəliş etmək
**emerge** [ı'mə:dʒ] *v* 1. **(from)** çıxmaq, görünmək, zahir/peyda olmaq; *The sun emerged from the clouds Günəş buludların arxasından çıxdı*; 2. *dən.* suyun üzünə çıxmaq/üzündə peyda olmaq; *The submarine emerged Sualtı qayıq suyun üzünə çıxdı*; 3. *məc.* xilas olmaq, qurtarmaq, qurtulmaq; **to ~ from poverty/slavery** yoxsulluqdan/əsarətdən qurtulmaq; 4. ortaya çıxmaq, meydana gəlmək *(sual və s. haq.)*; *Here emerges the question Burdan sual meydana çıxır; There emerged a necessity Ehtiyac meydana çıxdı*
**emergency[1]** [ı'mə:dʒənsı] *n* 1. fövqəladə vəziyyət, gözlənilməyən hadisə; son dərəcə ehtiyac; **the state of ~** fövqəladə vəziyyət *(ölkədə)*; **in case of ~** fövqəladə vəziyyətdə; 2. *tib.* xəstənin ağır vəziyyəti; 3. təcili yardım; **to administer ~ to the wounded** yaralılara ilk/təcili yardım göstərmək; **~ landing** *av.* məcburi yerə enmə/oturma
**emergency[2]** [ı'mə:dʒənsı] *adj* 1. ehtiyat; **~ door /exit** ehtiyat qapı/çıxış; **~ man** *id.* ehtiyat oyunçu; 2. fövqəladə; **~ measures/powers** fövqəladə tədbirlər/səlahiyyətlər; 3. *hərb.* toxunulmaz; **~ ration** toxunulmaz ərzaq; **~ store** toxunulmaz ehtiyat; 4. *tib.* təcili; **~ ambulance** təcili yardım maşını; **~ bag** təcili yardım göstərmək üçün çanta; **~ station** təcili yardım məntəqəsi; **~ case** təcili yardıma ehtiyacı olan xəstə; **~ brake** *d.y.* təcili tormoz/ əyləc
**emery** ['emərı] *n* sumbata
**emery-cloth** ['emərıklɔθ] *n* sumbata kağızı
**emery-paper** ['emərı,peıpə[r]] *n* = **emery-cloth**
**emesis** ['emısıs] *n tib.* qusma, qusuntu
**emigrant[1]** ['emıgrnt] *n* mühacir
**emigrant[2]** ['emıgrnt] *adj* 1. başqa yerə köçən; 2. mühacirət edən; 3. köçəri quşlar *(haq.)*
**emigrate** ['emıgreıt] *v* 1. mühacirət etmək, başqa ölkəyə köçmək; 2. köçürtmək *(başqa yerə)*, başqa yerə köçürmək *(əhalini)*
**emigration[1]** [,emı'greıʃn] *n* 1. köçmə; köçürmə;



köçürülmə; 2. mühacirət, mühacirlik; 3. *top.* i mühacirlər
**emigration[2]** [,emı'greıʃn] *adj* mühacir, mühacirlərə aid olan; **~ laws** mühacir qanunları, mühacirlərə aid olan qanunlar
**emigré** ['emıgreı] *n fr* mühacir; **Russian ~s** rus mühacirlər
**eminence** ['emınəns] *n* 1. hündürlük, yüksəklik; hündür yer, təpəlik, təpə; 2. yüksək/məsul vəzifə; **surgeons of ~** görkəmli cərrahlar; **~ in science** görkəmli elmi xidmətlər; **~ of soul** qəlbin böyüklüyü
**eminent** ['emınənt] *adj* 1. uca, yüksək, hündür, yüksələn, qalxan, artan; 2. görkəmli, məşhur; yüksək/məsul vəzifə tutan; **~ scientist** görkəmli alim; **~ writers** məşhur yazıçılar; 3. çox gözəl/yaxşı/qəşəng; **an ~ work of art** çox gözəl incəsənət əsəri
**emir** [e'mıə[r]] *n* əmir
**emirate** [ə'mıərıt] *n* əmirlik
**emissary** ['emısərı] *n* 1. emissar *(siyasi təşkilat və ya dövlət təşkilatı tərəfindən məxfi tapşırıqla başqa bir ölkəyə göndərilən şəxs)*; agent; 2. casus, kəşfiyyatçı
**emission** [ı'mıʃn] *n* 1. ayırma, ayrılma, çıxartma, çıxardılma *(istilik, qaz və s. haq.)*; buraxma, saçma, yayma *(işıq haq.)*; yayılma *(iy, qoxu, şüa, işıq haq.)*; **~ of heat** istilik buraxma/vermə; 2. *mal.* buraxılış, emissiya *(qiymətli kağızlar, bank biletləri və kağız pullar buraxılışı)*
**emit** [ı'mıt] *v (-tt)* 1. buraxmaq *(şüa)*; ayrılmaq *(istilik)*, çıxarmaq *(səs)*; 2. yaymaq *(üfunət, his)*; 3. *fiz.* buraxmaq, saçmaq, yaymaq *(radioaktiv zərrəciklər)*; 4. püskürmək *(tüstü, lava)*; *A volcano emits smoke and ashes Vulkan tüstü və kül püskürür*; 5. *mal.* buraxmaq *(pul)*; qiymətli kağızlar/kağız pullar buraxmaq
**emolliate** [ı'mɔlıeıt] *v* 1. nazlamaq, ərköyün böyütmək; 2. *tib.* yumşaltmaq
**emotion** [ı'mouʃn] *n* 1. nigarançılıq, narahatlıq, iztirab, təşviş, həyəcan; həvəs, ehtiras; **deep ~** dərin həyəcan; **with ~** şövqlə, həvəslə; 2. hiss, emosiya; **positive/ negative ~** müsbət/mənfi emosiya
**emotional** [ı'mouʃnl] *adj* emosional, həyəcanlandırıcı, həyəcan doğuran; **~ music** emosional musiqi; **~ speech** emosional nitq; **~ poetry** emosional/həyəcan doğuran poeziya; **~ response** emosional cavab
**emotionalism** [ı'mouʃnəlızm] *n* emosionallıq
**emotionalist** [ı'mouʃnəlıst] *n* hisslərlə yaşayan insan/adam
**emotionality** [ı,mouʃ'nælıtı] *n* emosionallıq
**emotionally** [ı'mouʃnəlı] *adv* emosional, həyəcanlı; həyəcanla; **to speak ~** həyəcanla/həyəcanlı danışmaq; **to affect ~** narahat etmək, hisslərə toxunmaq
**empathy** ['empəθı] *n* acıma, canı yanma, başqasının dərdinə şərik olma/halına acıma
**emperor** ['emprə[r]] *n* imperator; **the Roman ~s** Roma imperatorları
**emperorship** ['emprəʃıp] *n* 1. imperatorluq; imperator titulu/taxtı/taxt-tacı; imperator ləyaqəti; 2. imperatorun hökmranlıq etməsi
**empery** ['empərı] *n* 1. mütləq hakimiyyət; 2. imperiya, imperatorluq; çarlıq, şahlıq; 3. *məc.* səltənət, ağalıq, hökmranlıq, məmləkət, ölkə; **~ of joys** sevinc/fərəh ölkəsi
**emphasis** ['emfəsıs] *n (pl* **-ses**) 1. qeyd etmə/edilmə, nəzərə çatdırma/çatdırılma, xüsusi nəzərə çatdırma, vurğulama; **to lay special ~ on smth.** bir şeyi xüsusi olaraq nəzərə çarpdırmaq/vurğulamaq; 2. vurğu, aksent, ayırma
**emphasise** ['emfəsaız] *v* = **emphasize**
**emphasize** ['emfəsaız] *v* 1. vurğulamaq, qeyd etmək, xüsusi əhəmiyyət vermək, xüsusi olaraq nəzərə çatdırmaq *(sözü, faktı, fikri)*; 2. *dilç.* məntiqi vurğu qoymaq
**emphatic** [ım'fætık] *adj* 1. mənalı, ifadəli, təsirli; xüsusi olaraq nəzərə çarpdırılan, emfatik; 2. inadlı, təkidli *(xahiş və s. haq.)*; emfatik; **~ denial** qəti inkar (etmə); **~ opinion** qəti qənaət; **~ stress** emfatik vurğu
**emphatically** [ım'fætıklı] *adv* 1. mənalı-mənalı; xüsusi ifadə ilə; 2. *dilç.* emfatik; 3. inadla, təkidlə, cəsarətlə, qətiyyətlə, qəti surətdə
**empire** ['empaıə[r]] *n* 1. imperiya; **the Empire** 1) Britaniya imperiyası; 2) müqəddəs Roma imperiyası; 2. ali hakimiyyət, ağalıq, hökmranlıq
**empiric[1]** [em'pırık] *n* 1. ancaq təcrübəyə/ praktikaya əsaslanan adam, nəzəriyyəni lazımi qədər qiymətləndirməyən adam; 2. son dərəcə praktik adam; 3. *fəls.* empirik *(empirizm tərəfdarı)*
**empiric[2]** [em'pırık] *adj* = **empirical**
**empirical** [em'pırıkl] *adj* 1. *fəls.* empirik, təcrübəyə əsaslanan; **~ knowledge** təcrübəyə əsaslanan bilik; **~ method** tədqiqatın empirik metodu; 2. təcrübəni biliyin əsası hesab edən, nəzəriyyəni lazımi qədər qiymətləndirməyən; 3. türkəçarə; **~ remedies** türkəçarə dərmanlar
**empirically** [em'pırıkəlı] *adv* empirik, təcrübə əsasında
**employ[1]** [ım'plɔı] *n* muzdla görülən iş; qulluq, xidmət; **to be in ~** işi olmaq; **to be out of ~** işsiz olmaq; **to be in the ~ of smb.** bir kəsə işləmək/xidmət göstərmək; *The company has ten stenographers in its employ Şirkətdə on stenoqrafist işləyir*
**employ[2]** [ım'plɔı] *v* 1. iş vermək; işə götürmək; işdə saxlamaq; xidmətindən istifadə etmək; *The factory employs a thousand workers Fabrikdə min nəfər fəhlə işləyir*; **to be ~ed** muzdla işləmək, bir kəsin yanında xidmət etmək/işləmək; *100 men are employed by the firm Firmanın 100 nəfər fəhləsi var*; 2. işlətmək, sərf/istifadə/tətbiq etmək; **to ~ one's time in reading** vaxtını oxumağa sərf etmək; **to ~ a pen for sketching**

eskiz üçün qələmdən istifadə etmək; **to ~ questionable methods** şübhəli metodlardan istifadə etmək; **to ~ the right word** lazımi sözü işlətmək; 3. məşğul olmaq; *How do you employ yourself in the evenings? Axşamlar nə ilə məşğul olursan/olursunuz?*; **to be ~ed on research** tədqiqatla məşğul olmaq; 4. əyləndirmək *(bir kəsi)*; **to ~ a child at cutting out paper dolls** kağızdan kuklalar kəsməklə uşağı əyləndirmək

**employed** [ɪm'plɔɪd] *adj* işləyən, işi olan; **~ workers** işləyən fəhlələr

**employee** [,emplɔɪ'i:] *n* fəhlə; xidmətçi, qulluqçu; muzdla işləyən; **the mill's ~s** fabrikin fəhlələri və qulluqçuları

**employer** [ɪm'plɔɪə'] *n* 1. işverən, işə götürən; sahibkar; 2. sahib, yiyə, ağa

**employment**[1] [ɪm'plɔɪmənt] *n* 1. iş *(muzdla)*, xidmət; 2. iş, sənət, peşə, məşğuliyyət; 3. məşğulluq; **full ~** tam məşğulluq

**employment**[2] [ɪm'plɔɪmənt] *adj*: **~ exchange** əmək birjası; **~ figures** məşğulluq statistikası; **~ manager** fəhlə qəbulu şöbəsinin müdiri; **~ book** haqq-hesab kitabçası; **~ sheet** xidmət dəftərçəsi

**empoison** [ɪm'pɔɪzn] *v* 1. zəhərləmək *(bir kəsi)*; zəhər qoymaq *(bir şeyə)*; 2. *məc.* zəhərləmək; pozmaq *(həyatı)*; 3. sərtləşdirmək, amansızlaşdırmaq, qəzəbləndirmək, hirsləndirmək

**empoisoner** [ɪm'pɔɪznə'] *n arx.* zəhərləyən, zəhər verən

**empoisonment** [ɪm'pɔɪznmənt] *n arx.* zəhərləmə, zəhərlənmə

**emporium** [em'pɔ:rɪəm] *n (pl* **-ums** *və ya* **-ria**) 1. ticarət mərkəzi; bazar; 2. böyük mağaza, univermaq, universal mağaza

**empower** [ɪm'pauə'] *v* 1. vəkil etmək, vəkalət/səlahiyyət vermək; inanmaq, etibar etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsə bir şeyi etməyə səlahiyyət vermək; *I am empowered to state Bəyanat vermək üçün mənə səlahiyyət veriblər*; 2. imkan/hüquq/icazə vermək *(bir şey etmək üçün)*

**empowerment** [ɪm'pauəmənt] *n hüq.* 1. etibarnamə, vəkalətnamə; ixtiyar, səlahiyyət, vəkalət, hüquq; 2. etibarnamənin /səlahiyyətin rəsmiləşdirilməsi

**empress** ['emprɪs] *n* 1. imperatriçə; 2. *məc.* çariça, məlikə, hökmdar qadın; **the ~ of his heart** onun qəlbinin hökmdarı

**empty**[1] ['emptɪ] *n* 1. boş tara; **returned empties** qaytarılmış boş butulkalar/bankalar; *Empties to be returned Taralar qaytarılmalıdır*; 2. boş vaqon, yük maşını; 3. *pl d.y.* yüklənməmiş qatar, yüksüz/boş vaqonlar

**empty**[2] ['emptɪ] *adj* 1. boş, kimsə yaşamayan; **~ houses/streets** boş evlər/küçələr; 2. boş, mənasız; **~ promises/words/talks,** ***etc.*** boş vədlər/sözlər/danışıqlar *və s.*; **~ headed** başıboş, boş baş; **words ~ of meaning** mənasız/mənası olmayan sözlər; 3. yüngülxasiyyət, yelbeyin, yüngül, arsız; 4. *d.d.* ac; **to feel ~** acımaq, aclıq hiss etmək; **on an ~ stomach** acqarına; **~ stomachs** ac/aclıq çəkən adamlar

**empty**[3] ['emptɪ] *v* 1. boşaltmaq; içmək, içib boşaltmaq; 2. tökmək, boşaltmaq *(su, dən və s.)*; **to ~ water out of a glass** stəkandan suyu tökmək, stəkanın suyunu boşaltmaq; 3. axmaq, tökülmək *(çay haq.)*; *The St. Lawrence empties (itself) into the Atlantic Müqəddəs Lavrenti çayı Atlantik okeanına tökülür*

**empty-handed** ['emptɪ'hændɪd] *adj* əliboş; **to come ~** əliboş gəlmək

**empty-headed** ['emptɪ'hedɪd] *adj* başıboş, qayğısız, yüngül

**empty-pated**[1] ['emptɪ'peɪtɪd] *n* = **empty-headed**

**emulate** ['emjuleɪt] *v* 1. yarışmaq; ötüb keçməyə can atmaq; 2. rəqabət aparmaq; *Thine eye would emulate the diamond (Shakespeare) Sənin gözlərin brilyantla rəqabət apara bilər*; 3. təqlid etmək, nümunə götürmək; **to ~ the best** ən yaxşılardan nümunə götürmək

**emulation** [,emju'leɪʃn] *n* 1. yarış, müsabiqə; **socialist ~** sosializm yarışı; 2. rəqabət; 3. nümunə götürmə, təqlid etmə

**emulator** ['emjuleɪtə'] *n* 1. rəqib; 2. ardıcıl, məsləkdaş; 3. təqlidçi

**enable** [ɪ'neɪbl] *v* 1. bir kəsə bir şey etmək üçün imkan/ixtiyar vermək; *Leisure enabled him to read more Asudə vaxt ona daha çox oxumağa imkan verdi*; 2. mümkün etmək; imkan yaratmaq, yüngülləşdirmək; *Electricity enables rapid transit Elektrik sürətli daşımalar üçün şərait yaradır*; 3. *arx.* yararlı etmək; möhkəmləndirmək; *Exercise enables the body Fiziki məşqlər bədəni möhkəmləndirir*; 4. qanuna salmaq, qanuniləşdirmək, hüquqi status vermək

**enabling** [ɪ'neɪblɪŋ] *adj* 1. imkan verən; 2. *hüq.* səlahiyyət/hüquq verən *(qanunvericilik haq.)*; **~ act/statute** *amer.* fövqəladə səlahiyyətlərin verilməsi haqqında qanunverici akt

**enact**[1] [ɪ'nækt] *n arx.* 1. qərar, qətnamə; 2. əzm, qətiyyət, cəsarət, aydın məqsədi olma, müəyyən məqsədə doğru yönəldilmə

**enact**[2] [ɪ'nækt] *v* 1. sərəncam/göstəriş vermək, qərara almaq, qət etmək, dekret vermək; 2. qəbul etmək *(qanunu)*, qanuni qüvvə vermək *(əmrə, sərəncama və s.)*; qanunvericilik yolu ilə müəyyən etmək; *The president enacted the bill Prezident qanuna qol çəkdi/qanunu təsdiq etdi*; 3. baş vermək; **the place where the murder was ~ed** qətlin baş verdiyi yer

**enaction** [ɪ'nækʃn] *n* = **enactment**

**enactment** [ɪ'næktmənt] *n* 1. qanunun qəbul edilməsi; qanunun qüvvəyə minməsi; təsdiq etmə, qanuna qol çəkmə *(kral, prezident tərəfindən)*; 2. qanun, fərman; qanunverici akt; qərar; 3. vəziyyət, şərt, maddə *(qanunda)*; **the ~s for the regulation of trade** qanunda ticarəti tənzim edən maddələr



**enactor** [ɪ'næktə'] *n* qanunverən, qanunverici

**enamel**[1] [ɪ'næml] *n* 1. mina, şir; minadan düzəldilmiş məmulatlar; **collection of ~s** minalar kolleksiyası; 2. dişin minası *(üst qatı)*

**enamel**[2] [ɪ'næml] *adj* minalı; **~ pan** minalı qazan

**enamel**[3] [ɪ'næml] *v* 1. mina ilə örtmək, minalamaq, mina çəkmək; 2. şirləmək, şir çəkmək; 3. minalı boya ilə rəngləmək

**enamelled** [ɪ'næmld] *adj* üstünə mina çəkilmiş, minalı; minalanmış; **~ ware** minalanmış qabqacaq

**enameller** [ɪ'næmlə'] *n* minasaz *(minavuran usta)*

**enamelless** [ɪ'næmləs] *adj* minasız

**enamour** [ɪ'næmə'] *v* 1. heyran/valeh/məftun etmək; **to be ~ed of *smb.*** bir kəsə vurulmaq/məftun olmaq; 2. cəlb etmək, heyrətə salmaq, heyran olmaq; **to be ~ed of *smth.*** bir şeyə heyran olmaq

**enamourment** [ɪn'æməmənt] *n* vurğunluq, məftunluq, heyranlıq

**encage** [ɪn'keɪdʒ] *v* 1. qəfəsə salmaq; 2. azadlıqdan məhrum etmək

**encamp** [ɪn'kæmp] *v* 1. düşərgəyə malik olmaq; 2. düşərgə salmaq

**encampment** [ɪn'kæmpmənt] *n* 1. düşərgə; 2. düşərgə salma; müvəqqəti dayanacaq *(köçərilərin)*

**encapsule** [ɪn'kæpsju:l] *v* kapsul qoymaq

**encase** [ɪn'keɪs] *v* 1. qablaşdırmaq; qutuya/futlyara qoymaq; 2. örtmək, üz çəkmək

**encased** [ɪn'keɪst] *adj* örtülmüş; **banks ~ in granite** qranitlə örtülmüş sahillər; **~ in marble** mərmərlə örtülmüş

**encash** [ɪn'kæʃ] *v tic.* 1. realizə etmək, pula çevirmək *(malı)*; 2. nəqd pul almaq, inkasso etmək *(ödənilmək üçün sənəd təqdim etmək və sənədlər üzrə pul almaq)*

**encashable** [ɪn'kæʃəbl] *adj* realizə oluna bilən, satıla bilən, nəqd pula çevrilə bilən

**encashment** [ɪn'kæʃmənt] *n tic.* 1. nəqd pul alma; inkassiya; 2. nəqd pulla alınan məbləğ

**enceinte** [a:ŋ'sænt] *adj fr* hamilə, ikicanlı, boylu; *She is enceinte O, uşaq gözləyir, O, hamilədir*

**encephalitis** [,enkefə'laɪtɪs] *n tib.* ensefalit *(beyinin iltihabı)*

**encephalocele** [en'kefələsi:l] *n tib.* beyin qrijası

**encephalon** [en'kefələn] *n anat.* beyin

**enchafe** [ɪn'tʃeɪf] *v* 1. qızdırmaq, isitmək, istiləndirmək; 2. həyəcanlandırmaq, acıqlandırmaq, hirsləndirmək

**enchain** [ɪn'tʃeɪn] *v* 1. zəncirləmək, qandallamaq; 2. üzünə metal çəkmək; bağlamaq; **a speaker hoping to ~ the attention of the audience** auditoriyanın diqqətini özünə cəlb etməyə ümid edən natiq

**enchainment** [ɪn'tʃeɪnmənt] *n* 1. qandallama, zəncirləmə; bənd etmə *(zəncirlə)*; 2. əl-qolu bağlı olma, bağlılıq, bənd edilmə; 3. silsilə, sıra *(hadisə və s.)*

**enchair** [ɪn'tʃeə'] *v* 1. kürsüyə/kresloya oturtmaq; 2. taxt-taca oyləşdirmək

**enchannel** [ɪn'tʃænl] *v* kanala doğru istiqamətləndirmək

**enchant** [ɪn'tʃa:nt] *v* 1. heyran/valeh/məftun etmək; məmnun olmaq; *He was enchanted by the woman's beauty Qadının gözəlliyi onu heyran etdi*; *She was enchanted by/with the flowers sent to her Qadın ona göndərilən güllərdən məmnun oldu*; 2. ovsunlamaq, tilsimləmək, tilsimə salmaq; *Sleeping Beauty was enchanted Yatmış Gözəl tilsimlənmişdi*; 3. sehrli qüvvə vermək; **to ~ a ring** üzüyü sehrli etmək

**enchanted** [ɪn'tʃa:ntɪd] *adj* 1. heyran/valeh olmuş, vurulmuş; 2. ovsunlanmış, tilsimlənmiş

**enchanter** [ɪn'tʃa:ntə'] *n* 1. sehrbaz, cadugər; 2. fokusçu; 3. *arx.* hoqqabaz

**enchanting** [ɪn'tʃa:ntɪŋ] *adj* 1. heyranedici, cazibədar, füsunkar; 2. məftunedici, qəşəng

**encharge** [ɪn'tʃa:dʒ] *v* həvalə etmək, üzərinə qoymaq, tapşırmaq; **to ~ with a task** tapşırıq vermək

**enchase** [ɪn'tʃeɪs] *v arx.* I 1. qovmaq, qovub çıxartmaq; 2. dalınca qaçmaq/düşmək, izləmək, güdmək

**enchase** [ɪn'tʃeɪs] *v* II 1. çərçivəyə salmaq; **to ~ a gem with gold** bahalı daşı qızıl çərçivəyə salmaq; 2. **(with)** inkrustasiya ilə bəzəmək; 3. oyma ilə/naxışla bəzəmək; 4. **(in)** saxlamaq; **to have *smth.* ~d in *one's* memory** bir şeyi xatirində saxlamaq

**enchaser** [ɪn'tʃeɪsə'] *n* 1. oymaçı, həkkak, oyucu; 2. inkrustasiya ilə bəzəyən *(adam)*

**enchisel** [ɪn'tʃɪzl] *v* 1. naxış basmaq *(metala)*; 2. yonmaq *(heykəl və s.)*; 3. naxış vurmaq

**encipher** [ɪn'saɪfə'] *v* şifrləmək, şifr yazmaq; kodlaşdırmaq, kodla işarələmək

**encircle** [ɪn'sə:kl] *v* 1. əhatə etmək; *He encircled the child in his arms O, uşağı qolları arasına aldı*; 2. **(with)** dövrələmək, dövr etmək; *The Moon encircles the Earth Ay Yerin ətrafında dövr edir*

**encirclement** [ɪn'sə:klmənt] *n* dövrəyə alma, dövrələmə

**encircled** [ɪn'sə:kld] *adj* dövrələnmiş; əhatə olunmuş; **a house ~ by/with trees** ağaclarla dövrələnmiş/əhatə olunmuş ev

**encircling** [ɪn'sə:klɪŋ] *adj* əhatə edən, mühasirəyə/əhatəyə alan; **enemy troops ~ the town** şəhəri mühasirəyə alan düşmən qoşunları

**enclasp** [ɪn'kla:sp] *v* qucaqlamaq

**enclave** ['enkleɪv] *n fr* 1. *bir ərazinin daxilində olan və onunla əhatə edilmiş digər ərazi*; 2. bir qrup adam; **privileged ~** imtiyazlı əhali qrupu

**enclose** [ɪn'klouz] *v* 1. dövrələmək, mühasirəyə almaq, əhatə etmək, çəpərləmək, hasarlamaq;

haşiyələmək; to ~ with a fence ətrafına çəpər/hasar çəkmək; 2. qoymaq *(məktuba)*; əlavə etmək; 3. məhdudlaşdırmaq, bağlamaq *(yolu)*; 4. salmaq *(çərçivəyə)*

**enclosed** [ın'klouzd] *adj* bağlı, qapalı; çəpərlənmiş; ~ **space** bağlı/qapalı sahə; ~ **ground under cultivation** çəpərlənmiş əkin sahəsi

**enclosure** [ın'klouʒə<sup>r</sup>] *n* 1. çəpərlənmiş/ hasarlanmış yer; 2. çəpər, hasar, barı; çəpərləmə; 3. qoyma *(zərfə)*; 4. xalxal; **an ~ for horses** atlar üçün xalxal; 5. *qram.* qapanma

**encode** [ın'koud] *v* kodlamaq, kodlaşdırmaq, kodla işarələmək/yazmaq, şifrləmək, şifrlə yazmaq

**encoffin** [ın'kɔfın] *v* tabuta qoymaq

**encoffinment** [ın'kɔfınmənt] *n* tabuta qoyma

**encolour** [ın'kʌlə<sup>r</sup>] *v* yüngülcə rəngləmək, çalar vermək

**encompass** [ın'kʌmpəs] *v* 1. dövrələmək, mühasirəyə almaq, əhatə etmək; divar çəkmək; *He was encompassed by his guards O, cangüdənləri tərəfindən əhatə olunmuşdu*; 2. *məc.* əhatə etmək; **to ~ with care and attention** qayğı və diqqətlə əhatə etmək; 3. aid/dəxli olmaq; *The report encompasses a number of problems Məruzədə bir sıra problemlərə toxunulur*

**encore**[1] [ɔŋ'kɔ:] *n* təkrar etmə, təkrar ifa etmə/etməyə çağırma

**encore**[2] [ɔŋ'kɔ:] *v* bis qışqırmaq; **to ~ a singer** müğənnini bisə tutmaq, təkrar oxumağa çağırmaq; **to ~ a song** mahnının təkrar ifa olunmasını tələb etmək

**encounter**[1] [ın'kauntə<sup>r</sup>] *n* 1. gözlənilmədən /təsadüfən rast gəlmə; 2. toqquşma; tutaşma, dalaşma, söyüşmə; 3. duel; yarış; 4. *id.* yarış, qarşılaşma

**encounter**[2] [ın'kauntə<sup>r</sup>] *v* 1. gözlənilmədən/ təsadüfən rast gəlmək; **to ~ an old acquaintance** təsadüfən köhnə tanışa rast gəlmək; 2. toqquşmaq, dalaşmaq, söyüşmək; 3. rastlaşmaq *(çətinliklərlə və s.)*; 4. *id.* qarşılaşmaq *(rəqiblə)*

**encourage** [ın'kʌrıdʒ] *v* 1. ruhlandırmaq, ürəkləndirmək, ruh vermək; *Your appreciation of my work encourages me greatly Mənim işimə verdiyin/verdiyiniz qiymət məni çox ruhlandırır*; 2. həvəsləndirmək, rəğbətləndirmək, tərəfdar olmaq, təşviq etmək; **to ~ the arts** incəsənəti təşviq etmək

**encouragement** [ın'kʌrıdʒmənt] *n* 1. ruhlandırma, ürəkləndirmə; ruh vermə, canlandırma, şövqə gətirmə; **cries of ~** ruhlandırıcı çağırışlar/haraylar; 2. təşviq etmə, həvəsləndirmə, müdafiə etmə; tərəfdar olma; **to give ~ to** *smth.* bir şeyi müdafiə etmək; **to give no ~** soyuq münasibət göstərmək

**encourager** [ın'kʌrıdʒə<sup>r</sup>] *n* 1. ilhamverən, ilhamçı, ruhlandırıcı; 2. arxa, kömək, hami, himayəçi, havadar, tərəfdar

**encouraging** [ın'kʌrıdʒıŋ] *adj* 1. ruhlandırıcı, ürəkləndirici; **~ smile** ruhlandırıcı təbəssüm; 2. arxayınedici, ümidverici; 3. həvəsləndirici; *The results are encouraging Nəticələr ümidvericidir/həvəsləndiricidir*

**encouragingly** [ın'kʌrıdʒıŋlı] *adv* razılıqla, razı bir tərzdə, bəyənircəsinə; *She smiled encouragingly O razılıqla gülümsədi*

**encroach** [ın'kroutʃ] *v* 1. zorla girmək, soxulmaq, qarışmaq *(xüs. tədricən)*; zəbt/işğal etmək *(xüs. az-az)*; **to ~ upon the territory of a state** tədricən dövlətin ərazisinə soxulmaq; 2. qəsd etmək, toxunmaq; **to ~ upon/on human rights** insan hüquqlarına qəsd etmək/toxunmaq

**encroacher** [ın'kroutʃə<sup>r</sup>] *n* 1. işğalçı, istilaçı, qəsbkar; 2. qəsd edən *(adam)*

**encroachment** [ın'kroutʃmənt] *n* 1. girmə, soxulma *(tədricən)*; zəbt/işğal etmə; 2. qəsd, təcavüz, qəsd etmə, əl uzatma; **~ on freedom** azadlığa qəsd etmə; **criminal ~** cinayətkar qəsd; **~ on** *smb.'s* **privileges** bir kəsin imtiyazlarına qəsd etmə; **imperialist ~ on the independence of the young states** imperializmin gənc dövlətlərin müstəqilliyinə təcavüz etməsi; **~ on the freedom of nations** xalqların azadlığına təcavüz etmə; **to give a rebuff to all ~s on** *smb.'s* **sovereignty** bir kəsin suverenliyinə edilən bütün qəsdi/təcavüzü dəf etmək

**encrown** [ın'kraun] *v* tac qoymaq; tacı həvalə etmək

**encrust** [ın'krʌst] *v* 1. inkrustasiya ilə bəzəmək; 2. köz/ərp/pas bağlamaq

**encumber** [ın'kʌmbə<sup>r</sup>] *v* 1. çətinliyə/çətin vəziyyətə salmaq, mane olmaq, maneçilik törətmək; əl-qolunu bağlamaq; *His movements were encumbered by a heavy coat Ağır palto onun hərəkətini çətinləşdirirdi*; 2. tutmaq, qalmaq, doldurmaq; 3. zəhmət/əziyyət vermək, zəhmətə/əziyyətə salmaq

**encumbrance** [ın'kʌmbrns] *n* 1. manеə, əngəl, çətinlik; çətin/ağır vəziyyət; 2. yük, ağır yük, ağırlıq, ağır iş; 3. bir kəsin öhdəsində olan şəxs, öhdədə olan *(uşaqlar haq.)*; **without ~(s)** *d.d.* uşaqsız; 4. *hüq.* girov kağızı *(mülk, əmlak haq.)*

**encumbrancer** [ın'kʌmbrnsə<sup>r</sup>] *n hüq.* girov sahibi; başqa şəxsin əmlakının bir hissəsinə qanuni hüququ olan şəxs

**encurl** [ın'kə:l] *v* 1. hörmək, burmaq, burdurmaq *(saçı)*; 2. bir-birinə keçirmək *(sapları)*

**encurtain** [ın'kə:tn] *v* 1. pərdə/şirma ilə əhatə etmək; 2. maskalamaq, ört-basdır etmək, pərdələmək

**encyclopaedia** [ın.saıklə'pi:dıə] *n* = **encyclopedia**

**encyclopedia** [ın.saıklə'pi:dıə] *n* ensiklopediya; ◊ **walking ~** *məc.* "canlı" ensiklopediya *(hər şeydən məlumat verə bilən adam)*; erudit *(hər hansı bir sahədə geniş məlumatı olan adam)*



**encyclopaedic** [ın.saıklə'pi:dık] *n* = **encyclopedic**

**encyclopedic** [ın.saıklə'pi:dık] *adj* ensiklopediya, ensiklopedik; hər şeyi qavrayan/ anlaya bilən /əhatə edən; hər şeydən xəbərdar/məlumatlı, çox bilikli; **~ knowledge** ensiklopedik bilik

**end**[1] [end] *n* 1. son, axır; **the ~ of the world** dünyanın sonu; **to put an ~ to** *smth.* bir şeyə son qoymaq; **to bring to an ~** qurtarmaq, bitirmək, tamamlamaq, başa çatdırmaq; **to make an ~ of** *smth.* bir şeyi qurtarmaq, bir şeyə son qoymaq; **to come to an ~/to be at an ~** sona/başa çatmaq, qurtarmaq; *I've come to the end of my endurance Səbrim tükənib/qurtarıb*; **the ~ of the year** ilin sonu; **the ~ of a sentence/ story** cümlənin/hekayənin sonu; 2. ölüm, vəfat etmə; **to be near(ing)** *one's* **~** ölüm ayağında olmaq; **untimely ~** vaxtsız ölüm; **to be the ~ (of)** ölümə gətirib çıxartmaq, öldürmək; *That will be the end of me Bu mənim axırıma çıxar, Bu məni öldürəcək*; 3. son qoyma, yoxa çıxma, yox olma, axır; *That will be the end of all war Bu bütün müharibələrə son qoyacaq*; 4. qıraq, kənar, uc, baş, qurtaracaq, axır; **a silver watch at the ~ of a chain** zəncirin ucundakı gümüş saat; **on the ~ of a stick** ağacın ucunda/ başında; **at the southern ~ of the town** şəhərin cənub qurtaracağında; **from ~ to ~** başdan-başa; *There is no end to it Bunun axırı/sonu yoxdur*; **at the world's ~** dünyanın o başında; 5. *məc.* tərəf; **to approach the subject from the wrong ~** məsələyə əks tərəfdən yanaşmaq; **the business ~** işin praktik tərəfi; 6. *id.* meydanın/meydançanın yarısı; **to change ~s** meydanın yarısını dəyişmək; 7. hissə, şöbə; **our selling ~** bizim müəssisənin ticarət şöbəsi; 8. məqsəd, niyyət, qəsd, məram; **to accomplish** *one's* **~** məqsədinə nail olmaq; **to gain** *one's* **~** istədiyinə nail olmaq; **to pursue** *one's* **own ~** öz məqsədini güdmək; **an ~ in itself** məqsəd; *To what end? Nədən ötəri?, Hansı məqsədlə?*; **to no ~** məqsədsiz, faydasız, əbəs yerə; **to serve an ~** bir məqsədə xidmət etmək; **to serve no useful ~** faydasız/lazımsız olmaq; **for public ~s** ictimaiyyətin ehtiyacları/mənafeyi üçün; 9. nəticə, sonluq; **happy ~** müvəffəqiyyətli nəticə/sonluq; **The end** Filmin sonu;

◊ **at the ~** nəhayətdə, sonda; **in the ~** axırda, nəhayətdə, nəticədə; **to the ~ of time** əbədi, ömürlük, həmişəlik; **to the bitter ~** sona qədər, son imkana qədər, son damla qana qədər; **to be at the ~ of** *one's* **rope** çıxılmaz vəziyyətdə olmaq; **to be at** *one's* **wits' ~** tamamilə özünü itirmək, darıxmaq, çaşmaq; *I am at my wits' end Mən çaşmışam, Mən özümü itirmişəm*; **to hold/to keep** *one's* **~ up** təslim olmamaq, ruhdan düşməmək; **to make both ~s meet** çətinliklə/birtəhər dolanmaq

**end**[2] [end] *v* 1. qurtarmaq, başa çatdırmaq, bitirmək; **to ~** *one's* **labour on a book** kitab üzərində öz işini qurtarmaq; 2. kəsmək, qurtarmaq, dayandırmaq, saxlamaq; **to ~ testing now and for all time** nüvə silahlarının sınağına birdəfəlik /həmişəlik son qoymaq; **to ~ the cold war** soyuq müharibəyə son qoymaq; **to ~** *one's* **life** özünü öldürmək, intihar etmək, həyatına son qoymaq; 3. nəticələnmək, qurtarmaq, başa çatmaq; **to ~ in disaster** fəlakətlə nəticələnmək; *How does the story end? Hekayə nə ilə qurtarır?*; **to ~ in a draw/ in a tie** *id.* heç-heçə qurtarmaq;

◊ *All's well that ends well at. söz. Sonu yaxşı qurtaran hər şey yaxşıdır,* ≡ *Əvvəlin gəlincə, axırın gəlsin*

**endamage** [ın'dæmıdʒ] *v* zərər/ziyan vurmaq; korlamaq, xarab etmək

**endamagement** [ın'dæmıdʒmənt] *n* 1. zərər /ziyan vurma; 2. zərər, ziyan, sındırma, xarab etmə, korlama

**endanger** [ın'deındʒə<sup>r</sup>] *v* təhlükə altında qoymaq; qorxutmaq, hədələmək; **to ~ international peace** beynəlxalq sülhü təhlükə altına qoymaq

**end-cap** ['endkæp] *n tex.* qapaq, tıxac

**endear** [ın'dıə<sup>r</sup>] *v* 1. sevgi/məhəbbət oyatmaq; **to ~ oneself to** *one's* **friends** dostlarında özünə qarşı məhəbbət oyatmaq; 2. *arx.* qiymətləri qaldırmaq; 3. *arx.* artırmaq, böyütmək, şişirtmək, mübaliğə etmək; 4. *arx.* sevmək, istəmək, xoşlamaq, qədrini bilmək, qiymətləndirmək

**endearing** [ın'dıərıŋ] *adj* məftunedici, sevimli, qəşəng, yaxşı, cazibədar, məhəbbət/sevgi oyadan; **~ smile** məftunedici/ cazibədar təbəssüm

**endeavor**[1,2] [ın'devə<sup>r</sup>] *v amer.* = **endeavour**[1,2]

**endeavour**[1] [ın'devə<sup>r</sup>] *n* təşəbbüs, səy, cəhd; **to do** *one's* **~s** səy göstərmək; **to make every ~/to use** *one's* **best ~s** mümkün olan hər şeyi etmək

**endeavour**[2] [ın'devə<sup>r</sup>] *v* 1. səy/cəhd etmək, cəhd göstərmək, çalışmaq; **to ~ to compromise the case** məsələni kompromislə qurtarmaq üçün çalışmaq/səy göstərmək; **to ~ to see things as they are** şeyləri olduğu kimi görməyə çalışmaq; 2. can atmaq, cəhd etmək, əlləşmək, əldə etmək, nail/müvəffəq olmaq; **to ~ to win** qalib gəlməyə can atmaq; **to ~ after riches** var-dövlətə can atmaq; *They endeavoured to make the girl happy, but in vain Onlar çalışdılar/cəhd etdilər ki, qızı xoşbəxt etsinlər, lakin bu mümkün olmadı*

**ended** ['endıd] *adj* qurtarmış, bitmiş, başa çatmış, axıra yetmiş; bitirilmiş, tamamlanmış, başa çatdırılmış

**endemic**[1] [en'demık] *n tib.* endem, yerli, müəyyən bir yerə xas olan xəstəlik

**endemic**[2] [en'demık] *adj* 1. endemik *(müəyyən bir yerdə mövcud olan)*; 2. endemik, yerli

**ending**[1] ['endıŋ] *n* 1. son, axır, qurtaracaq; başa

çatdırma; sonluq, axırıncı hissə *(əsərdə)*; **happy ~** müvəffəqiyyətli sonluq; **the ~ of the world** dünyanın sonu; 2. *qram.* sonluq, şəkilçi, fleksiya; 3. *arx.* ölüm

**ending²** ['endɪŋ] *adj* son, axır, sonuncu, axırıncı

**end-item** ['end'aɪtəm] *n* hazır məhsul

**end-leaf** ['endli:f] *n (pl* **-leaves** [-li:vz]) forzas *(kitabın əvvəlində və axırında olan boş vərəq)*

**endless** ['endlɪs] *adj* 1. sonsuz; qurtarmaq bilməyən, tükənməz, nəhayətsiz; **~ debates** qurtarmaq bilməyən mübahisələr; 2. rulon, rulon şəklində *(kağız haq.)*; 3. hədsiz, qədərsiz, saysız-hesabsız, son dərəcə çox, təkrar, dönə-dönə; **~ attempts** saysız-hesabsız cəhdlər

**endlessly** ['endlɪslɪ] *adv* ardı-arası kəsilmədən, tükənməz bir surətdə, sonsuz olaraq

**endlessness** ['endlɪsnɪs] *n* nəhayətsizlik, sonsuzluq, ucu-bucağı olmama, hədsizlik, qurtarmaq bilməmə

**endocarditis** [,endouka:'daɪtɪs] *n tib.* endokardit *(ürəyin daxili qişasının iltihabı)*

**endocrine¹** ['endoukraɪn] *n fiziol.* daxili sekresiya vəziləri

**endocrine²** ['endoukraɪn] *adj fiziol.* sekresiya daxili endokrin; **~ glands** endokrin/ daxili sekresiya vəziləri

**endocrinology** [,endoukraɪ'nɔlədʒɪ] *n* endokrinologiya *(daxili ifrazat vəzilərindən bəhs edən elm)*

**endorse** [ɪn'dɔ:s] *v* 1. *mal.* *həvalə qeydi vermək, vekselin başqasına keçməsini təsdiq etmək üçün onun üzərinə qol çəkmək*; **to ~ a bill to *smb.*** vekseli bir kəsin adına keçirmək; 2. sənədə qol çəkmək *(arxa tərəfdə)*; sənədin arxa tərəfində qeyd etmək; 3. təsdiq etmək *(düzgünlüyünü)*; **to ~ a candidate** bir kəsin namizədliyini müdafiə etmək; **to ~ everything that a speaker has said** əvvəlki natiqin sözlərinə qoşulmaq

**endorsement** [ɪn'dɔ:smənt] *n* 1. *mal.* həvalə etmə qeydi *(çek, veksel və s. üzərində)*, indossament *(həvalə qeydi: vekselin başqasına keçməsini təsdiq etmək üçün veksel üzərində edilən qeyd; həvalə haqqında çek və s. pul sənədləri üzərində qeyd)*; **blank/general ~** blank üzərində həvalə etmə qeydi; **qualified ~** tərkibində xüsusi şərtlər olan həvalə qeydi; **restrictive ~** məhdud indossament; **special ~** üzərində ad yazılmış həvalə çeki; 2. sənədin arxa tərəfində imza; 3. təsdiq etmə, bəyənmə, müdafiə etmə; *This doctrine bears the endorsement of the very highest names Bu doktrinanı ən böyük avtoritetlər müdafiə edir*

**endow** [ɪn'dau] *v* 1. daimi gəlirlə təmin etmək; maddi cəhətdən təmin etmək; hədiyyə etmək *(xeyriyyə məqsədilə)*; **to ~ a college/a hospital/a church** kollecin/xəstəxananın/kilsənin saxlanması üçün ianə vermək; 2. vermək *(imtiyaz, hüquq)*; pay vermək; 3. bağışlamaq, hədiyyə etmək/ vermək; *Man is endowed with reason/ talent İnsana ağıl/istedad verilib*

**endowed** [ɪn'daud] *adj* 1. hədiyyə edilən əmanətdən/ianədən və vəsiyyətnamədən daim gəlir götürən; 2. istedadlı, zəkalı, çox qabiliyyətli

**endower** [ɪn'dauəʳ] *n* bir kəsə gəlir təyin edən şəxs; ianə verən, ianəçi

**endowment** [ɪn'daumənt] *n* 1. əmanəti təyin etmə, fondu/pul vəsaitini vermə *(instituta, kollecə və s.)*; 2. əmanət/hədiyyə/ ianə vermə; 3. zəka, qabiliyyət, istedad; **natural ~s** fitri qabiliyyət/istedad

**end product** ['end,prɔdəkt] *n* 1. hazır məhsul; 2. son məhsul; 3. son nəticə

**end-sheet** ['endʃi:t] *n* = **end-leaf**

**endue** [ɪn'dju:] *v* 1. vermək, təmin etmək; **to ~ with force** qüvvə/güc vermək; **to ~ with citizenship** vətəndaşlıq hüququ vermək; **to ~ with authority** səlahiyyət/ ixtiyar vermək; 2. geydirmək, qoymaq, taxmaq, geymək *(nə isə)*; **to ~ a heavy mail** ağır dəmir geyim/zireh geymək

**endurable** [ɪn'djuərəbl] *adj* 1. dözülə bilən, dözümlü; 2. möhkəm, bərk, davamlı, sarsılmaz

**endurance** [ɪn'djuərns] *n* 1. dözümlülük, dözüm, hövsələ, səbirlilik, səbir; *This is past/beyond endurance Bu, dözülməzdir*; **to show remarkable powers of ~** son dərəcə dözümlülük göstərmək; **to come to the end of *one's* ~** olan-qalan səbrini itirmək; 2. möhkəmlik, bərklik, davamlılıq, uzunömürlülük; 3. *tex.* möhkəmlik, dözüm, dağılmazlıq, köhnəlməzlik; 4. sınama, yoxlama, sınaqdan keçirmə, təcrübədən çıxartma, sınaq

**endurant** [ɪn'djuərnt] *adj* dözümlü, səbirli; **~ of evil** pisliyə/yamanlığa dözümlü

**endure** [ɪn'djuəʳ] *v* 1. dözmək, davam/tab gətirmək *(bir şeyə)*; **to ~ the rigours of an arctic winter** arktik qışın çətinliklərinə dözmək; 2. səbirlə yanaşmaq *(bir şeyə)*; *I cannot endure that man O adamdan zəhləm gedir, O adamı görməyə gözüm yoxdur; He cannot endure jazz Onun caz musiqisindən zəhləsi gedir*; 3. sağ qalmaq, ölməmək, möhkəm dayanmaq, müqavimət göstərmək, təslim olmamaq; *If help does not come, we must endure to the end Əgər kömək gəlməsə, biz təslim olmamalıyıq/axıradək dözməliyik; He may not endure long O, yaqin ki, çox davam gətirə bilməyəcək*

**enduring** [ɪn'djuərɪŋ] *adj* 1. möhkəm, bərk, davamlı, sarsılmaz; dözümlü, mətin; **~ peace** möhkəm/davamlı/sarsılmaz sülh; **~ disposition** səbirli/dözümlü/hövsələli xarakter; 2. ölməz, əbədi; **~ poetry** əbədi/ ölməz poeziya

**end-view** ['endvju:] *n* axırdan/yandan görünüş *(çertyojda)*

**end-zone** ['endzoun] *n id.* müdafiə zonası

**enema** ['enɪmə] *n tib.* imalə; **medicinal ~** dərmanlı/müalicəvi imalə

**enemy¹** ['enɪmɪ] *n* 1. düşmən, yağı; **bitter ~** qatı düşmən; **to be sworn enemies** qatı düşmən olmaq; 2. *hərb. (Özündən sonra fel həm təkdə,*



*həm də cəmdə işlənə bilər)* düşmən, rəqib; *The enemy is/are in large force Düşmən qüvvəsi böyük miqdardadır; The enemy are forced to retreat Düşmən geri çəkilməyə məcburdur*;
◊ **to be *one's* own ~** özünün düşməni olmaq; **the great/last ~** ölüm, əcəl

**enemy²** ['enɪmɪ] *adj* 1. *hərb.* düşmən; **~ camp** düşmən düşərgəsi; **~ dead** düşmənin həlak olmuş əsgərləri və zabitləri; **~ information** düşmən haqqında məlumat; **~ lines** düşmənin tutduğu mövqe; **~ aviation/ships/submarines** düşmən aviasiyası/ gəmiləri /sualtı qayıqları; 2. *arx.* qeyri-səmimi; bədxah, pis niyyətli

**energetic** [,enə'dʒetɪk] *adj* 1. çalışqan, fəal, səyli; güclü; **an ~ child** çalışqan/fəal uşaq; 2. çox güclü/təsirli, bərk təsir edən; **~ remedy** güclü/bərk təsir edən dərman

**energetical** [,enə'dʒetɪkl] *adj* = **energetic**

**energetically** [,enə'dʒetɪklɪ] *adv* səylə, çalışqanlıqla; çox bərk/güclü, fəal surətdə

**energetics** [,enə'dʒetɪks] *n* energetika

**energize, -ise** ['enədʒaɪz] *v* 1. enerji oyatmaq; hərəkətə gətirmək; 2. *tex.* enerji ilə təmin etmək; 3. *el.* gərginliyə qoşmaq

**energy** ['enədʒɪ] *n* 1. enerji; qüvvə, qüdrət; 2. *pl* güc, zor, qüvvət, fəallıq, çalışqanlıq, fəaliyyət; **to apply/to devote *one's* energies** gücünü tətbiq etmək; 3. *tex.* enerji, güc, qüvvə; **nuclear /solar/electrical/ therminal ~** nüvə/günəş /elektrik/istilik enerjisi; **potential/kinetic /latent ~** potensial/kinetik/gizli enerji

**enfeeble** [ɪn'fi:bl] *v* zəiflətmək, zəifləmək; qüvvədən salmaq/məhrum etmək

**enfeebled** [ɪn'fi:bld] *adj* zəifləmiş, əldən düşmüş, üzülmüş; **a country ~ by war** müharibədən zəifləmiş ölkə; **~ by age** qocalıqdan əldən düşmüş; **an ~ political system** zəifləmiş siyasi sistem; **~ by illness** xəstəlikdən zəifləmiş; **to be ~ by a long illness** uzun xəstəlikdən üzülmək

**enfever** [ɪn'fi:vəʳ] *v* 1. qızdırmaya səbəb olmaq, qızdırma tutmaq; 2. qəzəbləndirmək, qeyzləndirmək

**enforce** [ɪn'fɔ:s] *v* 1. məcbur/vadar etmək; **to ~ obedience** sözə baxmağa məcbur etmək, itaətə məcbur etmək; 2. zorla boynuna qoymaq/qəbul etdirmək; **to ~ a plan upon *smb.*** planı bir kəsə zorla qəbul etdirmək; 3. həyata keçirmək *(qanunu və s.)*; icranı təmin etmək; **to ~ laws** qanunları həyata keçirməyə məcbur etmək; *This regulation is difficult to enforce Bu qaydanı həyata keçirmək çətindir; Order was enforced by police Nizam-intizam polis vasitəsilə həyata keçirildi*; 4. *hüq.* almaq, tələb etmək; **to ~ by action** məhkəmə yolu ilə tələb etmək; **to ~ payment** ödənişi almaq/tələb etmək; 5. həyata keçirmək, yerinə yetirmək; **to ~ judg(e)ment** hökmü həyata keçirməyə/yerinə yetirməyə məcbur etmək; 6. sanksiya ilə təmin etmək

**enforceable** [ɪn'fɔ:səbl] *adj* 1. həyata keçirilə bilən *(qanun, plan və s. haq.)*; 2. *hüq.* iddiası/qüvvəsi olan

**enforcement** [ɪn'fɔ:smənt] *n* 1. təzyiq, məcbur etmə, məcburiyyət; **by ~** məcbur etməklə; məcburi qaydada; 2. həyata keçirmə *(qanunu və s.)*, qanunların yerinə yetirilməsinə nəzarət; **the ~ of morals** əxlaq normalarının gözlənilməsinə nəzarət; 3. *hüq.* ödənişlərin məcburi şəkildə alınması; 4. *hüq.* həyata keçirmə, yerinə yetirmə; **~ of judg(e)ment/of a writ** hökmü/əmri həyata keçirmə; **road-safety ~** yol polisi; **~ action** icbari iş; **~ measures** məcburi tədbirlər

**enfranchise** [ɪn'fræntʃaɪz] *v* 1. siyasi hüquqlar vermək *(əsasən seçki hüquqları)*; *In Britain women were enfranchised in 1918 Britaniyada qadınlara seçki hüququ 1918-ci ildə verildi*; 2. azad etmək *(həbsdən)*; 3. özünüidarə hüququ vermək *(şəhərə)*; 4. vətəndaşlığa qəbul etmək; vətəndaşlıq hüquqları vermək

**enfranchisement** [ɪn'fræntʃɪzmənt] *n* 1. vətəndaş hüquqlarının/siyasi hüquqların verilməsi *(əsasən seçki hüquqları)*; 2. azad etmə *(köləlikdən, tabelikdən, həbsdən)*; 3. özünüidarə hüququnun verilməsi *(şəhərə)*; 4. vətəndaşlığa qəbul etmə

**engage** [ɪn'geɪdʒ] *v* 1. tutmaq; **to ~ a guide /a servant** bələdçi/xidmətçi tutmaq; *He engaged Smith as his lawyer O, Smiti özünə vəkil tutdu*; 2. nişanlanmaq, adaxlanmaq *(adət. məchulda)*; *He was engaged some days ago O bir neçə gün bundan əvvəl nişanlandı*; 3. sifariş etmək; **to ~ hotel rooms** mehmanxanada otaq sifariş etmək; **to ~ a seat** bilet sifariş etmək *(teatra, konsertə və s.)*; *The seat is engaged Bu yer tutulub*; 4. **(in, on, with)** məşğul olmaq; **to ~ in teaching** dərs verməklə məşğul olmaq, müəllim olmaq; **to ~ in an attempt** cəhd etmək; **to ~ in conversation** söhbətlə məşğul olmaq; **to ~ in a game of tennis** tennis oynamaqla məşğul olmaq; 5. *(adət. məchul növdə)* məşğul olmaq; *Say I am engaged Deyin ki, məşğulam; He was engaged with a pipe O, qəlyan çəkməklə məşğul idi*; 6. almaq, tutmaq; *Reading engages all my time Kitab oxumaq mənim bütün vaxtımı alır*; 7. cəlb etmək *(diqqəti, nəzəri)*; **to ~ all eyes** hamının diqqətini cəlb etmək; 8. öhdəlik götürmək; **to ~ oneself** öz üzərinə öhdəlik götürmək, vəd /söz vermək; **to ~ oneself to provide accommodation for the delegates** nümayəndələri yerləşdirməyi öz üzərinə götürmək; 9. öhdəlik qoymaq; **to ~ by new commitments** yeni öhdəlik qoymaq

**engaged** [ɪn'geɪdʒd] *adj* 1. nişanlanmış, adaxlanmış; **~ couple** nişanlılar *(oğlan və qız)*; 2. məşğul, tutulmuş

**engagement** [ɪn'geɪdʒmənt] *n* 1. iş, sənət, peşə, məşğuliyyət; 2. dəvət *(qəbul olunmuş)*; görüş *(təyin olunmuş)*; razılıq, saziş; razılaşma *(görüş*

*haq.); We had an engagement to play golf at 4 Saat 4-də qolf oynamaq üçün biz razılaşmışdıq;* 3. *pl* öhdəlik; **to meet** *one's* **~s** öhdəliklərini yerinə yetirmək; **to break an ~** öhdəliyi yerinə yetirməmək; **international ~** beynəlxalq öhdəlik; **to enter into an ~** öhdəlik götürmək; 4. nişan, nişanlanma

**engager** [ɪn'geɪdʒəʳ] *n* 1. kirayənişin, icarədar; 2. üzərinə öhdəlik götürən şəxs; 3. zamin, zamin olan, zəmanətçi

**engaging** [ɪn'geɪdʒɪŋ] *adj* cazibəli, cazibədar, səvimli; xoşagələn; **~ smile** cazibəli/ cazibədar təbəssüm; **~ manners** xoşagələn xasiyyətlər

**engem** [ɪn'dʒem] *v* daş-qaşla bəzəmək

**engender** [ɪn'dʒendəʳ] *v* 1. doğurmaq, törətmək, səbəb olmaq, əmələ gətirmək, yaratmaq; bais olmaq, nəticələnmək; **to ~ discontent /strife /despair** narazılığa/ədavətə/ümidsizliyə səbəb olmaq; **to ~ hope** ümid doğurmaq; **to ~ argument** mübahisə doğurmaq; **to ~ misunderstanding** anlaşılmazlığa səbəb/bais olmaq; 2. *arx.* doğulmaq, anadan olmaq, dünyaya gəlmək

**engine** ['endʒɪn] *n* 1. maşın, mühərrik; **portable ~** *tex.* yüngül/daşına bilən lokomobil *(buxarla işləyən və başqa maşınları hərəkətə gətirən motor)*; **combustion/explosion/gas ~** *tex.* daxili yanacaqlı mühərrik; **oil ~** neft mühərriki; **aircraft ~** təyyarə mühərriki; 2. buxar maşını; 3. lokomotiv *tex. (rels üzərində işləyən və vaqonları hərəkətə gətirən maşın/parovoz/ teplovoz/elektrovoz)*; 4. *arx.* alət, mexanizm, vasitə; **~s of torture** işgəncə aləti/ vasitəsi; **an ~ of destruction** məhv etmək üçün vasitə; **the hidden ~s** gizli vasitələr;

◊ **~ oil** mühərrik yağı

**engine-crew** ['endʒɪnkru:] *n* parovoz briqadası/ekipajı

**engine-driver** ['endʒɪn.draɪvəʳ] *n d.y.* maşinist, parovozsürən

**engineer**[1] [.endʒɪ'nɪəʳ] *n* 1. mühəndis; konstruktor; **industrial ~** istehsalın təşkili üzrə mühəndis; **methods ~** iş metodlarının səmərələşdirilməsi üzrə mühəndis; **process ~** mühəndis-texnoloq, texnologiya mütəxəssisi; 2. mühəndis-mexanik; **railway ~** dəmiryol mühəndisi; **civil ~** tikinti mühəndisi; **electrical ~** mühəndis-elektrik; **~s and other technical workers** mühəndis və başqa texniki işçilər; **profession of an ~** mühəndislik, mühəndis peşəsi

**engineer**[2] [.endʒɪ'nɪəʳ] *v* 1. təşkil etmək; 2. yaratmaq, tikmək, qurmaq; layihə düzəltmək; 3. mühəndis yaxud texnik işləmək

**engineering**[1] [.endʒɪ'nɪərɪŋ] *n* 1. texnika; 2. mühəndis sənəti; **radio ~** radiotexnika *(elektrotexnikanın radiodan bəhs edən şöbəsi)*; **cinematograph ~** kino texnikası; **industrial ~** istehsalın təşkili texnikası; 3. maşınqayırma, maşın istehsalı

**engineering**[2] [.endʒɪ'nɪərɪŋ] *adj* 1. tətbiqi *(elm haq.)*; 2. texniki; **~ data** texniki məlumatlar/rəqəmlər; **~ library** texniki kitabxana; **~ cloth** iş paltarı üçün parça

**engineership** [.endʒɪ'nɪəʃɪp] *n* mühəndis/ texnik sənəti /vəzifəsi

**engine house** ['endʒɪnhaus] *n* parovoz deposu

**engineman** ['endʒɪnmən] *n (pl* **-men** [-mən]) maşinist; mexanik

**engine-room** ['endʒɪnrum] *n* maşın şöbəsi

**enginery** ['endʒɪnərɪ] *n* 1. maşınlar; mexaniki təchizat/ləvazimat; 2. hərbi texnika

**engladden** [ɪn'glædn] *v* şadlandırmaq, sevindirmək, şənləndirmək

**English**[1] ['ɪŋglɪʃ] *n* 1. **(the ~)** ingilislər; 2. ingilis dili; **Old ~** qədim ingilis dili; **Modern ~** müasir ingilis dili; **Standard ~** ədəbi ingilis dili; **to speak ~** ingiliscə danışmaq; **to translate from the ~** ingilis dilindən tərcümə etmək; **the king's/the queen's ~** nöqsansız ingilis dili; **in ~** ingiliscə; **to write in ~** ingiliscə yazmaq

**English**[2] ['ɪŋglɪʃ] *adj* 1. ingilis; **~ words** ingilis sözləri; **~ literature** ingilis ədəbiyyatı; 2. ingilis dilinə aid olan; **~ teacher** ingilis dili müəllimi

**engloom** [ɪn'glu:m] *v* 1. tutqunlaşdırmaq, qaraltmaq, tündləşdirmək; 2. kədərləndirmək, əhvalı/ovqatı pozmaq, qan qaraltmaq, pərt etmək

**englut** [ɪn'glʌt] *v* 1. udmaq *(acgözlüklə)*; yemək, aşırmaq; 2. doydurmaq, doyuzdurmaq

**engolden** [ɪn'gouldn] *v* qızıl suyuna çəkmək; zərləmək, zər vurmaq

**engorge** [ɪn'gɔ:dʒ] *v* çox/həddindən artıq yemək

**engorgement** [ɪn'gɔ:dʒmənt] *n* 1. acgözlük, qarınquluq; 2. *tib.* durğunluq, ölgünlük, qan laxtası/yığılması

**engorger** [ɪn'gɔ:dʒəʳ] *n arx.* acgöz, qarınqulu

**engouement** [.a:ŋgu:'ma:ŋ] *n fr* həvəs, şövq, maraq, meyl

**engrail** [ɪn'greɪl] *v* 1. diş-diş kəsmək; 2. dalğayabənzər etmək *(bir şeyin qırağını)*

**engrain** [ɪn'greɪn] *v* 1. tətbiq etmək, dəb salmaq; 2. aşılamaq *(adət, vərdiş və s. haq.)*; 3. davamlı boya ilə rəngləmək; boyanı canına çəkdirmək

**engrained** [ɪn'greɪnd] *adj* 1. kök salmış, müəyyənləşmiş *(adət, vərdiş haq.)*; 2. qəddar, qatı, kök salmış, islahedilməz

**engrasp** [ɪn'gra:sp] *v* qucaqlamaq

**engrave** [ɪn'greɪv] *v* 1. oymaq, həkk etmək, naxış açmaq; kəsmək *(ağac, daş, metal üzərində)*; 2. **(on, upon)** dərin iz buraxmaq *(yaddaşda, hafizədə)*

**engraver** [ɪn'greɪvəʳ] *n* 1. oymaçı, həkkak, oyucu *(daş, ağac, sümük və s. üzərində naxış açan usta)*; 2. oyma alətləri; **electronic ~** elektron oyma maşını

**engraving** [ɪn'greɪvɪŋ] *n* 1. oyma, həkk etmə; 2. qravüra; 3. kəsilmiş/oyulmuş yazı; kəsilmiş/oyulmuş şəkil/surət/təsvir; 4. dərin təəssürat



**engross** [ɪn'grous] *v (adət. məc.)* cəlb etmək, təsiri altına almaq; başı qarışmaq; *He was so engrossed in watching the game that he did not notice the cold Onun başı oyuna elə qarışmışdı ki, soyuğu hiss etmirdi*

**engulf** [ɪn'gʌlf] *v* udmaq, çökmək, batmaq *(girdabda, burulğanda, alovda, lavada)*; basmaq *(su)*; *The village was engulfed by the flood Sel kəndi basmışdı; Lava engulfed the village Lava kəndi basdı*

**enhance** [ɪn'ha:ns] *v* 1. artırmaq *(təhlükəni və s.)*; ağırlaşdırmaq *(günahı)*; 2. artırmaq *(qiyməti, keyfiyyəti, nüfuzu, əhəmiyyəti)*

**enheaven** [ɪn'hevn] *v din.* göylərə qaldırmaq /yüksəltmək

**enhungered** [ɪn'hʌŋgəd] *adj arx.* ac, bərk acmış, uzun müddət ac qalmış, acından zəif düşmüş

**enigma** [ɪ'nɪgmə] *n* 1. tapmaca; **answer to an ~** tapmacaya cavab; 2. anlaşılmaz hadisə; qəribə adam; *I've known him for many years, but he remains a complete enigma to me Mən onu uzun illərdir ki, tanıyıram, lakin o hələ də mənim üçün tamamilə anlaşılmaz olaraq qalır*

**enigmatic** [.enɪg'mætɪk] *adj* anlaşılmaz; sirli, qəribə, müəmmalı

**enigmatically** [.enɪg'mætɪklɪ] *adv* anlaşılmaz surətdə, üstüörtülü, müəmmalı; **to speak ~** üstüörtülü/müəmmalı danışmaq

**enigmatize, -ise** [ɪ'nɪgmətaɪz] *v* 1. tapmaca düzəltmək /quraşdırmaq; 2. eyhamla/üstüörtülü danışmaq; 3. anlaşılmaz etmək

**enjail** [ɪn'dʒeɪl] *v* həbsə salmaq

**enjoin** [ɪn'dʒɔɪn] *v* 1. göstəriş vermək, tapşırmaq, tələb etmək, məcbur etmək *(bir şeyə)*; *Their religion enjoins obedience Onların dini itaət tələb edir*; **to ~** *smth.* **on/upon** *smb.* bir kəsi bir şeyə məcbur etmək; **to ~ secrecy upon** *one's* **friends** dostlarını sirləri saxlamağa məcbur etmək; 2. buyurmaq, tələb etmək, hökm vermək *(bir kəsə)*; *They enjoined their children to be quiet Onlar uşaqlarından səs salmamağı tələb etdilər*; 3. *hüq.* qadağan etmək; **to ~** *smb.* **from infringing a right** bir kəsə başqalarının hüquqlarını pozmağı qadağan etmək

**enjoy** [ɪn'dʒɔɪ] *v* 1. ləzzət/həzz/zövq almaq, məzələnmək *(bir şeydən)*; **to ~ music** musiqidən ləzzət almaq; *Did you enjoy your holiday? Sən/Siz məzuniyyətini/ məzuniyyətinizi yaxşı keçirdinmi?/keçirdinizmi?; Did you enjoy the film/ Film xoşuna /xoşunuza gəldimi?*; **to ~ oneself** vaxtı yaxşı keçirmək; əylənmək, kef çəkmək; dilxoşluq etmək; *He enjoyed himself in the Crimea O, Krımda vaxtını yaxşı keçirdi*; 2. istifadə etmək, faydalanmaq, malik olmaq; **to ~ diplomatic privileges** diplomatik imtiyazlara/üstünlüklərə malik olmaq; **to ~ rights** hüquqlara malik olmaq

**enjoyable** [ɪn'dʒɔɪəbl] *adj* xoş, zövq/ləzzət verən, ləzzətli, nəşəli

**enjoyment** [ɪn'dʒɔɪmənt] *n* 1. kef, ləzzət, sevgi, zövq, nəşə, həzz; **his ~ of music** onun musiqiyə olan sevgisi; **to take great ~ in** *smth.* bir şeydən çox ləzzət almaq; 2. sahib/malik olma *(bir şeyə)*, istifadə etmə/edilmə; **~ of a fortune** vardövlətə malik olma; **~ of** *one's* **legal right** qanuni hüququndan istifadə etmə

**enlarge** [ɪn'la:dʒ] *v* 1. böyütmək, genişləndirmək, artırmaq; **to ~ a hotel by building a new wing** yeni qanad tikməklə mehmanxananı genişləndirmək/böyütmək; **to ~ the scope of activity** fəaliyyət dairəsini genişləndirmək; **to ~ the powers vested in the government** hökumətin səlahiyyətini artırmaq/genişləndirmək; 2. böyümək, genişlənmək; artmaq, çoxalmaq; 3. **(on, upon)** yayılmaq, yaymaq, genişləndirmək, genişlənmək; **to ~ upon a theme** mövzunu genişləndirmək

**enlarged** [ɪn'la:dʒd] *adj* geniş, artırılmış, böyüdülmüş; **~ meeting** geniş iclas; **~ photograph** böyüdülmüş şəkil

**enlargement** [ɪn'la:dʒmənt] *n* 1. genişlənmə, genişləndirmə, genişləndirilmə; yayma, yayılma, böyütmə, böyüdülmə; 2. əlavə/sonradan əlavə edilmiş tikili; 3. inkişaf, təkmilləşmə, yüksəliş; **the ~ of the mind** mənəvi yüksəliş/inkişaf

**enlarger** [ɪn'la:dʒəʳ] *n* fotoböyüdücü *(cihaz)*

**enlight** [ɪn'laɪt] *v arx.* 1. işıqlandırmaq; 2. *məc.* aydınlaşdırmaq, izah etmək

**enlighten** [ɪn'laɪtn] *v* 1. maarifləndirmək; **to ~ the masses** kütlələri maarifləndirmək; 2. xəbər /məlumat vermək, xəbərdar etmək, bildirmək; *The hint enlightened her Bu işarə ona hər şeyi aydın etdi; He enlightened them O onları xəbərdar etdi*

**enlightened** [ɪn'laɪtnd] *adj* oxumuş, elmli, bilikli, mədəni, ziyalı; **thoroughly ~ on the subject** mövzudan dərin məlumatı olan

**enlightener** [ɪn'laɪtnəʳ] *n* 1. maarifçi, maarifpərvər; 2. xəbərçi, xəbərverən, məlumatverən, məlumat mənbəyi

**enlightenment** [ɪn'laɪtnmənt] *n* maariflənmə, maarifçilik; **the age of Enlightenment** Maarifçilik dövrü (XVIII əsr)

**enlist** [ɪn'lɪst] *v* 1. hərbi qulluğa daxil olmaq *(könüllü)*; *He enlisted at the age of 17 O, on yeddi yaşında könüllü olaraq hərbi qulluğa daxil oldu/əsgərliyə getdi*; 2. hərbi xidmətə adam toplamaq/cəlb etmək/götürmək/qəbul etmək; 3. təşkilata/ qrupa götürmək/qəbul etmək; 4. təmin etmək; **to ~ co-operation** birgə fəaliyyəti təmin etmək

**enlistment** [ɪn'lɪstmənt] *n* 1. *hərb.* hərbi qulluğa daxil olma *(könüllü)*; 2. hərbi qulluğa götürmə/qəbul etmə; 3. könüllü əsgərin xidmət müddəti *(kontrakt üzrə)*; 4. qəbul etmə, daxil olma *(təşkilata və s.)*; **~ drive** könüllülərin orduya cəlb olunması üzrə kampaniya

**enliven** [ɪn'laɪvn] *v* **1.** rövnəqləndirmək, canlandırmaq; **to ~ party** qonaqlığı canlandırmaq; **2.** ürəkləndirmək, ilham vermək, ruhlandırmaq
**enlock** [ɪn'lɔk] *v* bağlamaq, bağlı saxlamaq
**enmity** ['enmɪtɪ] *n* **1.** düşmənçilik, ədavət, kin; **at ~ with** ***smb.*** bir kəslə ədavətdə olma; **2.** qərəz, hirs, acıq, qəzəb; bədxahlıq
**enormity** [ɪ'nɔ:mɪtɪ] *n* **1.** nəhənglik; **the ~ of a task/decision** məsələnin/qərarın nəhəngliyi; **2.** dəhşətli cinayət; **3.** alçaqlıq, rəzillik
**enormous** [ɪ'nɔ:məs] *adj* **1.** çox iri/yekə/böyük, zorba, nəhəng, sonsuz; **~ changes** çox böyük dəyişikliklər; **~ sum** çox böyük məbləğ; **~ bliss** sonsuz xoşbəxtlik/ səadət; **~ woe** çox böyük dərd; **2.** son dərəcə böyük; dəhşətli, alçaq, rəzil; **~ appetite** son dərəcə böyük /iti iştaha; **~ crime** dəhşətli cinayət
**enormously** [ɪ'nɔ:məslɪ] *adv* olduqca, son dərəcə, çox, olduqca/çox bərk; *I enjoyed it enormously Bu mənim çox xoşuma gəldi; The town has changed enormously Şəhər son dərəcə dəyişib*
**enormousness** [ɪ'nɔ:məsnɪs] *n* böyüklük, irilik, zorbalıq, yekəlik; genişlik; **the ~ of a whale** balinanın iriliyi/zorbalığı
**enough[1]** [ɪ'nʌf] *adj* lazımi/kifayət qədər; **to have ~ work/time** kifayət qədər işi/vaxtı olmaq
**enough[2]** [ɪ'nʌf] *adv* lazımınca, çox yaxşı, kifayət qədər; *This rope is not long enough Bu ip kifayət qədər uzun deyil; She sings well enough O, kifayət qədər /çox yaxşı oxuyur*
**enplane** [ɪn'pleɪn] *v* təyyarəyə minmək, təyyarəyə yük vurmaq/yükləmək
**enrage** [ɪn'reɪdʒ] *v* qəzəbləndirmək, hirsləndirmək, acıqlandırmaq; qızışdırmaq; **to ~** ***smb.*** bir kəsi hirsləndirmək/qəzəbləndirmək
**enraged** [ɪn'reɪdʒd] *adj* hirslənmiş, hirsləndirilmiş, özündən çıxmış/çıxardılmış, qəzəblənmiş, qəzəbləndirilmiş; **~ at/by** ***smb.'s*** **stupidity** bir kəsin səfehliyinə hirslənmək/qəzəblənmək
**enragedly** [ɪn'reɪdʒɪdlɪ] *adv* qəzəblə, qeyzlə; acıqlı, qeyzli, qəzəbli-qəzəbli, dəli kimi, quduzcasına
**enragement** [ɪn'reɪdʒmənt] *n* qəzəb, acıq, qeyz, azğınlıq, quduzluq
**enrapture** [ɪn'ræptʃə^r] *v* **1.** heyran/valeh/ məftun etmək; **2.** ilham vermək, ruhlandırmaq
**enregister** [ɪn'redʒɪstə^r] *v* **1.** daxil etmək; qeyd etmək, qeydə almaq, yazmaq *(siyahıya/akta/protokola)*; **2.** qanun kimi rəsmiləşdirmək
**enrich** [ɪn'rɪtʃ] *v* **1.** zənginləşdirmək, varlandırmaq, dövlətli etmək; *The discovery of oil will enrich the nation Neftin kəşfi milləti varlandıracaq / zənginləşdirəcək*; **2.** *məc.* zənginləşdirmək, genişləndirmək, artırmaq; *Music has enriched his life Musiqi onun həyatını zənginləşdirdi*; **3.** münbitləşdirmək, yaxşılaşdırmaq, təkmilləşdirmək; **to ~ soil** torpağı münbitləşdirmək; **4.** vitaminləşdirmək, qidalılığı artırmaq *(ərzaqda)*
**enriched** [ɪn'rɪtʃt] *adj* **1.** zənginləşmiş, yaxşılaşdırılmış, təkmilləşdirilmiş; **~ uranium** zənginləşmiş uran *(izotop vasitəsilə)*; **2.** vitaminləşdirilmiş; **~ bread** vitaminləşdirilmiş çörək
**enrichment** [ɪn'rɪtʃmənt] *n* **1.** zənginləşdirmə, varlandırma; **2.** bəzəmə, bəzək/yaraşıq vurma; **3.** torpağı gübrələmə; **4.** vitaminləşdirilmə, vitaminləşdirmə
**enrol** [ɪn'roul] *v* **1.** siyahıya daxil etmək; qeyd etmək, qeydə almaq, yazmaq; **2.** yazmaq *(təşkilatın və s.-nin üzvlüyünə)*; cəlb etmək; **3.** *hərb.* orduya götürmək/ qəbul etmək; **4.** yazılmaq *(təşkilata və s.)*; *I have enroled in a dancing class Mən rəqs sinfinə yazılmışam*; **5.** hərbi qulluğa daxil olmaq
**enrolment** [ɪn'roulmənt] *n* **1.** siyahıya/registro daxil etmə; qeyd etmə, qeydə alma; **2.** qeydə alma aktı; **3.** təşkilatın üzvlüyünə qəbul; **4.** *hərb.* hərbi qulluğa götürmə/qəbul etmə
**ensign** ['ensaɪn] *n* **1.** nişan, emblem, kokarda *(rəsmi papaqlara vurulan dəmir nişan)*; **2.** bayraq, vımpel; **blue ~** gəminin dal tərəfinə sancılan mavi ingilis bayrağı; **red ~** ingilis ticarət bayrağı; **white ~** ingilis hərbi-dəniz bayrağı; **to serve under the white ~** *dən.* hərbi-dəniz donanmasında qulluq etmək; **3.** bayraqdar, bayraqçı
**ensign-bearer** ['ensaɪn.beərə^r] *n* **1.** bayraqdar, bayraqçı; **2.** *jarq.* əyyaş, içki düşkünü
**enslave** [ɪn'sleɪv] *v* **1.** qul/kölə etmək, əsarət altına almaq; **2.** əsir etmək; **to be ~d by** ***one's*** **passions** ehtiraslarının əsiri olmaq
**enslavement** [ɪn'sleɪvmənt] *n* **1.** qul etmə, əsarət altına salma/alma; **2.** köləlik, əsarət; **3.** kölə itaətkarlığı
**enslaver** [ɪn'sleɪvə^r] *n* **1.** əsarətçi, qul/əsir edən; **2.** *məc.* afət, dilbər, heyran/məftun/ valeh/ cəlb edən *(qız, qadın)*
**ensue** [ɪn'sju:] *v* **1.** ardınca/dalınca əmələ gəlmək, hökm sürmək, alınmaq, nəticədə baş vermək; irəli gəlmək, doğmaq; *Silence ensued Sakitlik hökm sürdü; A catastrophe must ensue Qəza labüddür/ qaçılmazdır; That such a consequence should ensue was far from my thoughts Bu cür nəticələrin mümkünlüyü heç vaxt mənim fikrimə gəlmirdi*; **2.** *arx.* can atmaq, axtarmaq, nail olmaq; **~ peace** sülhə can atmaq/nail olmaq; **~ beauty** gözəllik axtarmaq
**ensure** [ɪn'ʃuə^r] *v* **1.** təmin etmək; zəmanət vermək, zamin olmaq; **to ~ independence** müstəqilliyi təmin etmək; müstəqilliyə zəmanət vermək; *We cannot ensure success Biz müvəffəqiyyətə zəmanət verə bilmərik*; **in order to ~ prompt and effective action** sürətli və effektiv hərəkət/fəaliyyət təmin etmək üçün; **to ~ world peace** bütün dünyada sülhü təmin etmək; **to ~ road safety** yol hərəkətinin təhlükəsizliyini təmin etmək; **to ~ further economic progress** iqtisadiyyatın gələcək yüksəlişini təmin etmək; **2.** *arx.* sığorta etmək



**entame** [ɪn'teɪm] *v* ram etmək, əhliləşdirmək, ələ öyrətmək *(vəhşi heyvanları)*
**entangle** [ɪn'tæŋgl] *v* **1.** qarışdırmaq, dolaşdırmaq, dolaşıq salmaq; *My fishing line got entangled in some weeds Mənim tilovum yosunlara dolaşdı*; **2.** dolaşdırmaq *(saçı və s.)*; **3.** qatmaq, cəlb etmək *(bir işə)*, qarışdırmaq, sövq etmək, sürükləmək; **to ~** ***smb.*** **in a quarrel** bir kəsi mübahisəyə cəlb etmək/sürükləmək
**entangled** [ɪn'tæŋgld] *adj* dolaşıq, qarışıq; **~ argument** dolaşıq dəlillər/sübutlar
**entanglement** [ɪn'tæŋglmənt] *n* **1.** dolaşıqlıq, qarışıqlıq; **2.** çətinlik, çətin vəziyyət; mürəkkəblik *(vəziyyət haq.)*; **3.** cəlb etmə, çəkmə, çəkilmə; **4.** *hərb.* məftil çəpər
**entente** [a:n'ta:nt] *n fr.* **1.** saziş, razılıq, razılaşma, anlaşma; **2.** bir qrup dövlət arasında dostluq sazişi
**enter** [entə^r] *v* **1.** daxil olmaq; **to ~ a room/ a city** otağa/şəhərə daxil olmaq; **to ~ the army** əsgəri/hərbi xidmətə daxil olmaq; *We were surprised to see a strange enter Biz yad adamın daxil olduğunu görəndə təəccübləndik*; **to ~ a party** partiyaya daxil olmaq; **to ~ into an alliance** ittifaqa daxil olmaq; **2.** axmaq, tökülmək *(çay haq.)*; **3.** girmək; **to ~ a college** kollecə girmək; **to ~ a battle** döyüşə girmək; **to be ~ing a new phase** yeni mərhələyə girmək; **4.** batmaq, sancılmaq, keçmək, girmək; *The bullet entered the heart Güllə ürəyə girdi; The idea never entered my head Bu fikir heç vaxt mənim başıma batmadı; The thorn entered the flesh Tikan ətə batdı*; **5.** yazmaq, əlavə/daxil etmək, salmaq, qeyd etmək *(kitaba, siyahıya)*, qeydə almaq; **to ~ a name** adı qeydə almaq, soyadı siyahıya daxil etmək; **to ~ an event** hadisəni qeyd etmək; **to ~ a word in a dictionary** sözü lüğətə daxil etmək; **6.** iştirak etmək; **to ~ a race** cıdırda iştirak etmək; **to ~ the competition** yarışda iştirak etmək; **7.** *hüq.* məhkəmə işinə başlamaq; **to ~ an action against** ***smb.*** bir kəsə qarşı iş qaldırmaq; **8.** *hüq.* məlumat/xəbər vermək, elan etmək, bəyanat vermək *(yazılı şəkildə)*; işə əlavə etmək *(sənədi)*; **to ~ protest** protest elan etmək; **9.** öyrətmək, təlim etmək *(iti)*; **10.** *iqt.* deklarasiyanı gömrükxanaya vermək; **to ~ into negotiations** danışıqlara başlamaq; **to ~ into a treaty** müqaviləyə qoşulmaq; **to ~ into obligations** öz üzərinə öhdəlik götürmək; **to ~ into** ***smb.'s*** **ideas/ feelings** bir kəsin fikirlərinə/hisslərinə şərik olmaq; **to ~ on a project** layihəni yerinə yetirməyə başlamaq; **to ~ up** qeyd etmək, yazmaq; *The book-keeper was entering up profits for the last month Hesabdar keçən ayın gəlirini kitaba yazırdı*
**enteric[1]** [en'terɪk] *n tib.* qarın yatalağı
**enteric[2]** [en'terɪk] *adj anat.* qarın, bağırsaq; **~ fever** qarın yatalağı
**enteritis** [entə'raɪtɪs] *n tib.* enterit *(nazik bağırsaqların iltihabı)*
**enterprise** ['entəpraɪz] *n* **1.** sənaye müəssisəsi; zavod, fabrik; **small ~s** kiçik müəssisələr; **2.** sahibkarlıq; **private ~** xüsusi sahibkarlıq; **3.** işə girişmə *(xətərli)*; **to embark on an ~** xətərli işə girişmək; **4.** zirəklik, təşəbbüskarlıq, bacarıqlılıq, işgüzarlıq; **a man of ~** bacarıqlı/ zirək/işgüzar/tədbirli adam
**enterprising** ['entəpraɪzɪŋ] *adj* bacarıqlı, zirək, təşəbbüskar, işgüzar, tədbirli
**enterprisingly** ['entəpraɪzɪŋlɪ] *adv* cəsarətlə, bacarıqla, təşəbbüskarlıqla, zirək
**entertain** [.entə'teɪn] *v* **1.** qonaq qəbul etmək; qonaqpərəstlik göstərmək; qəbul düzəltmək, yemək-içmək vermək; *We seldom entertain Biz gec-gec qonaq qəbul edirik; They entertain a great deal Onlar tez-tez qonaqlıq təşkil edirlər*; **to ~ friends at (to) dinner** dostları nahara dəvət/qonaq etmək, dostlara ziyafət vermək; *They like to entertain Onlar qonaqpərəstdirlər. Onlar qonaq qəbul etməyi xoşlayırlar*; **2.** əyləndirmək, məşğul etmək; **to ~** ***smb.*** **with songs** bir kəsi mahnılarla əyləndirmək; **to ~ oneself** əylənmək, məşğul olmaq; **3.** bəsləmək *(ümid və s.)*; **to ~ an idea/a theory** fikrə/nəzəriyyəyə tərəfdar olmaq; **4.** nəzərə almaq; **to ~ a proposal** təklifi nəzərə almaq; **to ~ an opinion** fikri nəzərə almaq
**entertainer** [.entə'teɪnə^r] *n* **1.** estrada artisti; konferansye; **2.** ev sahibi, qonaq qəbul edən
**entertaining** [.entə'teɪnɪŋ] *adj* maraqlı, məzəli, əyləncəli; gülməli, qəribə, əyləndirici
**entertainment** [.entə'teɪnmənt] *n* **1.** tamaşa; **2.** estrada konserti; **3.** əyləncə; **to give /to afford ~** əyləndirmək, məşğul etmək, güldürmək; **much to the ~ of** ***smb.*** bir kəsin zövqünə/kefinə görə; **4.** qonaq qəbulu; banket, ziyafət; **to give an ~** qəbul/ ziyafət düzəltmək, nahar/şam yeməyi vermək; **5.** yemək-içmək, yemək; **a great deal of company but poor ~** qonaq çox, yemək az
**enthrone** [ɪn'θroun] *v* taxta oturtmaq; *He was enthroned in 1741 O, 1741-ci ildə taxta çıxdı/oturdu*
**enthronement** [ɪn'θrounmənt] *n* taxta çıxma/oturma
**enthuse** [ɪn'θju:z] *v* ruh yüksəkliyi oyatmaq, heyran olmaq; *He enthused the audience with his suggestions Onun təklifləri dinləyicilərdə ruh yüksəkliyi oyatdı*; **to be ~d** heyran olmaq /etmək; *They were enthused over the painting Onlar şəklə heyran olmuşdular*
**enthusiasm** [ɪn'θju:zɪæzm] *n* şövq, ruh yüksəkliyi, həyəcan; ruhlandırma
**enthusiast** [ɪn'θju:zɪæst] *n* entuziast *(böyük şövq və həvəslə işləyən adam)*
**enthusiastic** [ɪn.θju:zɪ'æstɪk] *adj* qızğın, coşğun,

ehtiraslı; ~ **theatre-goer** qızğın teatr həvəskarı; *His welcome was less than enthusiastic Onu soyuq tərzdə qarşıladılar*

**enthusiastically** [ın.θju:zı'æstıklı] *adv* şövqlə, sevinclə, şadlıqla, fərəhlə, məmnuniyyətlə; ruh yüksəkliyilə

**entice** [ın'taıs] *v* 1. yoldan çıxartmaq, şirnikdirmək, azdırmaq; **to ~ with false promises** yalan vədlərlə yoldan çıxartmaq; 2. aldatmaq, cəlb etmək, tovlamaq, tovlayıb öz tərəfinə çəkmək; **to ~ a bird into a cage** quşu aldadıb qəfəsə salmaq

**enticement** [ın'taısmənt] *n* 1. tovlama, aldatma, aldadıb tora/tələyə salma; yoldan çıxartma, azdırma, tamaha salma, yoldan/ başdan çıxaran şey; 2. tələ yemi; 3. *məc.* cazibə, şirnikdirici şey

**enticer** [ın'taısə$^r$] *n* azdıran/yoldan çıxaran/ tamaha salan adam

**enticing** [ın'taısıŋ] *adj* azdırıcı, aldadıcı, tovlayan, yoldan çıxaran

**entire** [ın'taıə$^r$] *adj* 1. tam, tamam; bütün; **the ~ country** bütün ölkə; **the ~ world** bütün dünya; **the ~ medical profession** bütün tibb işçiləri; **~ liberty of conscience** tam vicdan azadlığı; 2. bütöv, bölünməz, vahid, toxunulmamış, əl dəyməmiş; *The fortifications were entire İstehkamlara toxunulmamışdı; His heart was entire O hələ sevməmişdi*; 3. təmiz, saf, xalis, qatışıqsız; 4. axtalanmamış *(heyvan haq.)*

**entirely** [ın'taıəlı] *adv* 1. tamamilə, bütünlüklə, büsbütün; *He is entirely convinced O tamamilə əmindir; He is entirely reliable Ona tamamilə bel bağlamaq olar; I am entirely at your disposal Mən tamamilə sənin/sizin sərəncamındayam/sərəncamınızdayam; This is not entirely convincing Bu çox da inandırıcı deyil*; 2. yalnız, yeganə, tək, təkcə, məhz, ancaq, fəqət; *I say it entirely for your own good Mən bunu yalnız/ancaq sənin/sizin xeyrin /xeyriniz üçün deyirəm*

**entitle** [ın'taıtl] *v* 1. ixtiyar vermək; **to be ~d** ixtiyarı olmaq; **to be ~d to a leave** məzuniyyətə ixtiyarı olmaq; *We are entitled to know the truth Bizim həqiqəti bilməyə ixtiyarımız var*; 2. sərlövhə/ad vermək, başlıq qoymaq; **to ~ an article** məqaləyə ad vermək/başlıq qoymaq; 3. vəkil etmək, vəkalət/səlahiyyət/ixtiyar vermək; **to be ~d** səlahiyyətli olmaq, vəkil edilmək; *I am entitled to say it Bunu deməyə mənim səlahiyyətim var; He entitled me to speak for him O mənə tam ixtiyar verib ki, onun adından danışım*; 4. titul/ad/cəngavər rütbəsi və s. vermək; 5. titulu ilə çağırmaq, rütbəsinin adı ilə çağırmaq

**entitlement** [ın'taıtlmənt] *n* 1. ad; 2. ixtiyar *(kömək etməyə, müavinət verməyə)*; qabaqcadan təyin/müəyyən edilmiş norma; **~ to furlough** məzuniyyətə ixtiyarı olma *(hərbi xidmətçilər haq.)*; **~ to replacement** əmlakın əvəz edilməsi üçün təyin edilmiş norma

**entomb** [ın'tu:m] *v* 1. basdırmaq, quyulamaq; 2. məqbərə/sərdabə/türbə kimi xidmət etmək; 3. örtmək, üstünü basdırmaq, gizlətmək, gizli saxlamaq

**entombment** [ın'tu:mmənt] *n* 1. dəfn, dəfn mərasimi, basdırma; 2. qəbir, məzar, gor, məqbərə, sərdabə, türbə

**entomological** [.entəmə'lɔdʒıkl] *adj* entomologiya, entomoloji

**entomologist** [.entə'mɔlədʒıst] *n* entomoloq *(entomologiya üzrə mütəxəssis)*

**entomology** [.entəmɔ'lədʒı] *n* entomologiya *(zoologiyanın həşəratlardan/böcəklərdən bəhs edən bölməsi)*

**entrails** ['entreılz] *n anat.* içalat, bağırsaqlar; *The dish was made from the entrails of a sheep Xörək qoyun içalatından hazırlanmışdı*

**entrance**[1] ['entrns] *n* 1. giriş; giriş qapısı; alaqapı; **back ~** dal giriş qapısı; **front ~** ön giriş qapısı; 2. giriş, girmə *(miniklə)*; *No entrance Giriş qadağandır, Giriş yoxdur (miniklə)*; **to force an ~** zorla girmək/soxulmaq/basıb girmək; 3. çıxış *(aktyorun səhnəyə və s.)*; 4. çıxış *(təntənəli)*; **to await the ~ of the king** kralın çıxışını gözləmək; 5. girmə, daxil olma *(ittifaqa, universitetə və s.)*; **his ~ to Baki University** onun Bakı Universitetinə daxil olması; 6. *arx.* başlama, gəlmə, olma, yaxınlaşma; **the ~ of the spring** baharın gəlməsi/yaxınlaşması

**entrance**[2] ['entrns] *adj* giriş, qəbul; **~ fee** giriş/daxil olma haqqı; **~ hall** vestibül; **~ visa** ölkəyə daxil olma vizası; **~ examinations** qəbul imtahanları

**entrance**[3] [ın'tra:ns] *v* 1. ekstaz/donub/quruyub qalma vəziyyətinə gətirmək; *The snake entranced the hare with its gaze İlan öz baxışı ilə evdovşanını yerində dondurdu*; 2. heyran/valeh/məftun etmək, tilsimləmək, ovsunlamaq; *They listened entranced Onlar ovsunlanmış kimi qulaq asdılar*

**entrancement** [ın'tra:nsmənt] *n* 1. trans *(hipnoz, ekstaz və s. zamanı şüurun tutulması, özünü/huşunu itirmə)*, ekstaz, mat/ donub/quruyub qalma; 2. tilsimlənmə, ovsunlanma; mat qalma, ekstaz vəziyyətinə düşmə

**entrant** ['entrənt] *n* imtahan verən *(ali məktəbə)*; iştirakçı *(yarışda)*

**entreat** [ın'tri:t] *v* 1. yalvarmaq, yalvarıb-yaxarmaq; *I entreat you to think Yalvarıram fikirləş/fikirləşin*; 2. yalvarıb/yalvar-yaxarla almaq; **to ~ *smth.* of *smb.*** bir kəsdən yalvar-yaxarla bir şey almaq; 3. hesab etmək; *They were entreated as maniacs Onları dəli hesab edirdilər*; 4. *arx.* danışıqlar aparmaq; **to ~ with *smb.* of peace** bir kəslə sülh haqqında danışıqlar aparmaq

**entreatingly** [ın'tri:tıŋlı] *adv* yalvarırcasına, yalvarmaqla, yalvarışla, yalvara-yalvara

**entreaty** [ın'tri:tı] *n* yalvarma, yalvarış; təkidli/çox güclü/ehtiraslı xahiş; *He was deaf to the entreaties of the girl O, qızın yalvarışlarını eşitmədi*



**entrecôte** [.a:ŋtrə'kout] *n fr* antrekot *(miyantən, qabırğaarası ət; bu ətdən hazırlanan qızartma)*

**entrench** [ın'trentʃ] *v* 1. *hərb.* möhkəmlənmək, möhkəmləndirmək; 2. *hərb.* istehkam xətti düzəltmək, müdafiə vasitələri ilə təmin etmək; 3. **(upon)** pozmaq *(hüquqları və s.)*, qarışmaq; **to ~ upon the privileges of parliament** parlament imtiyazlarına qarışmaq; **to ~ upon *smb's* leisure** bir kəsin asudə vaxtına müdaxilə etmək

**entrenched** [ın'trentʃt] *adj* 1. *hərb.* səngərlərlə bərkidilmiş, istehkam şəklinə salınmış; **~ position** möhkəmləndirilmiş/ istehkam şəklinə salınmış mövqe; 2. möhkəm, qüvvətli

**entrenchment** [ın'trentʃmənt] *n* 1. *hərb.* səngər; 2. səhra istehkamı; 3. istehkam

**entrepreneur** [.ɔntrəprə'nə:$^r$] *n fr* sahibkar, müəssisə sahibi; **small ~** kiçik müəssisə sahibi

**entrust** [ın'trʌst] *v* həvalə/etibar etmək, üzərinə qoymaq, tapşırmaq, inanmaq; səlahiyyət vermək; **to ~ *smb.* with *one's* property, to ~ *one's* property to *smb.*** (öz) əmlakını bir kəsə etibar etmək; **to ~ *smb.* with a secret** sirri bir kəsə etibar etmək; *The government was entrusted with ample powers Hökumətə geniş səlahiyyətlər verildi*

**entry**[1] ['entrı] *n* I 1. giriş, girmə *(miniklə)*; *No entry Giriş yoxdur*; 2. *id.* suya giriş; 3. təntənəli surətdə çıxış/çıxma; **the king's ~** kralın çıxışı; 4. aktyorun səhnəyə çıxışı; 5. girmə, daxil olma; *The children were surprised by the sudden entry of their teacher Uşaqlar müəllimlərinin qəflətən daxil olmasından təəccübləndilər*; **~ into combat** *amer.* döyüşə girmə; 6. giriş qapısı; giriş, yol, keçid; 7. dəhliz, vestibül; 8. *amer.* başlanğıc, əvvəl *(vaxt haq.)*; gəlmə; **~ of a month** ayın əvvəli, yeni ayın gəlməsi

**entry** ['entrı] *n* II 1. yazma, qeyd/daxil etmə *(siyahıya, ticarət kitabına)*; 2. yazılar, qeydlər *(kitabda, sənəddə və s.)*; **to make an ~** kitaba və s. yazmaq/qeyd etmək; **to post an ~** *hərb.* uçot sənədində yazmaq; **~ on the map** xəritədə işarə/ nişan/qeyd etmək; 3. baş söz *(lüğətə daxil edilən)*; məqalə *(ensiklopediyaya daxil edilən)*; 4. iştirakçıların siyahısı *(müsabiqədə, sərgidə, yarışda)*; **large ~** böyük müsabiqə; 5. *id.* iştirak etmək üçün ərizə; 6. eksponat *(sərgidə)*; müsabiqəyə göndərilmiş əsər; **to judge between the entries** jürinin üzvü olmaq; 7. *iqt.* gömrükxana deklarasiyası; **~ inwards/outwards** gəlmək/getmək üçün deklarasiya

**entry**[2] ['entrı] *adj* daxil olma; **~ visa** daxil olma vizası *(ölkəyə)*; **~ list** iştirakçıların siyahısı *(yarışda, müsabiqədə)*

**entwine** [ın'twaın] *v* 1. hörmək, toxumaq; **to ~ roses with lilies** qızılgülləri zanbaqlarla hörmək; 2. sarılmaq, dolanmaq, sarmaşmaq; *Ivy entwines itself about/around /round trees Sarmaşıq ağaclara sarılır/ sarmaşır*

**entwinement** [ın'twaınmənt] *n* 1. toxuma, toxunma, hörmə, hörülmə; 2. sıx əlaqə

**enumerate** [ı'nju:məreıt] *v* 1. bir-bir saymaq; *He enumerated the plants found on the island O, adada tapılan bitkiləri bir-bir saydı*; 2. təkrar saymaq, yenidən hesablamaq, siyahıyaalma keçirmək, təzədən yazmaq *(əhalinin sayını və s.)*

**enumerated** [ı'nju:məreıtıd] *adj* bir-bir sayılmış *(adları)*

**enumeration** [ı.nju:mə'reıʃn] *n* 1. bir-bir sayma /sayılma/hesablama/hesablanma; 2. hesab, hesaba alma; siyahı; siyahıyaalma, siyahıyaalınma; 3. reyestr, cədvəl

**enunciate** [ı'nʌnsıeıt] *v* 1. elan etmək, təntənəli surətdə bildirmək/demək; **to ~ a principle** prinsipi elan etmək; 2. qısaca və dürüst ifadə /xülasə/şərh/izah etmək, başa salmaq; 3. tələffüz etmək; **to ~ correctly** düzgün tələffüz etmək

**enunciation** [ı.nʌnsı'eıʃn] *n* 1. təntənəli surətdə bildirmə/demə; 2. qısaca və dürüst ifadə/şərh/izah etmə, başa salma; 3. tələffüz etmə, diksiya

**enveil** [ın'veıl] *v* 1. örtüklə bürümək/sarımaq/dolamaq/bələmək; örtük/pərdə altında gizlətmək; 2. çulğalamaq, bürümək, örtmək *(duman və s. haq.)*

**envelop** [ın'veləp] *v* 1. çulğalamaq, bürümək, hər tərəfdən örtmək, üstünü örtmək; 2. bükmək, sarımaq; bələmək *(uşağı)*

**envelope** ['envıloup] *n* 1. konvert, paket, zərf; 2. dolama, sarıma, bükmə; cild, üz; 3. *tex.* hörmə, tikmə; 4. *fiziol.* qabıq, qişa, nazik pərdə/təbəqə, qaysaq; 5. *bot.* sarıma *(bitki haq.)*

**enveloped** [ın'veləpt] *adj* bürünmüş, çulğalanmış, örtülmüş; batmış; **~ in flame** alova bürünmüş; **~ in mystery** sirlə çulğalanmış, sirrə qərq olmuş; **distant hills ~ in a haze** dumana bürünmüş uzaq dağlar; **~ in sin** günaha batmış

**envenom** [ın'venəm] *v* 1. zəhərləmək; zəhər tökmək; **to ~ arrows** oxları zəhərləmək; 2. *məc.* zəhərləmək, korlamaq, dözülməz etmək; **to ~ *smb.'s* life** bir kəsin həyatını zəhərləmək; 3. qeyzləndirmək, qəzəbləndirmək, hirsləndirmək, acıqlandırmaq

**envenomed** [ın'venəmd] *adj* 1. qeyzli, qəzəbli, hirsli, acıqlı; 2. *məc.* acı; **~ tongue** acı dil; 3. *arx.* zəhərli; **~ cup** zəhərli qədəh/piyalə

**enviable** ['envıəbl] *adj* həsəd/qibtə oyadan; **~ position** həsəd/qibtə oyadan vəziyyət

**enviably** ['envıəblı] *adv* paxıllıqla, həsədlə

**envier** ['envıə$^r$] *n* paxıl, paxıl adam

**envious** ['envıəs] *adj* 1. paxıl; **~ looks** paxıl baxışlar; **~ tongues** paxıl dillər, paxıl adamların dili; **to be ~ of another's good fortune** başqasının səadətinə/var-dövlətinə həsəd aparmaq; 2. bədxah, qərəzkar, hirsli, acılı, qəzəbli, kinli

**enviously** ['envıəslı] *adv* paxıllıqla, həsədlə

**enviousness** ['envıəsnıs] *n* paxıllıq, həsəd

**environment** [ın'vaıərnmənt] *n* mühit, şərait;

*one's* **home** ~ ailə mühiti, ev şəraiti; **ending nuclear weapon tests in all ~s** bütün şəraitdə nüvə silahlarının sınaqdan keçirilməsinə son qoyma

**environmental** [ɪn,vaɪərn'mentl] *adj* mühitə aid olan; ~ **study** ətraf mühitin təsir xüsusiyyətlərinin öyrənilməsi;

◊ ~ **chamber** süni iqlim kamerası

**envisage** [ɪn'vɪzɪdʒ] *v* **1.** gözünə baxmaq *(təhlükənin və s.): You must envisage realities Sən/Siz həqiqətin gözünə baxmalısan/baxmalısınız;* **2.** təsəvvür etmək, təsəvvürə gətirmək; *They tried to envisage the future Onlar gələcəyi təsəvvür etməyə çalışdılar;* **3.** nəzərdə tutmaq, qabaqcadan nəzərə almaq, ehtimal etmək; **to ~ changes** dəyişiklikləri nəzərdə tutmaq/nəzərə almaq; *The proposals envisage no land reforms Bu təkliflərdə torpaq islahatları nəzərdə tutulmur;* **4.** qabaqcadan /gələcəyi görmək; **to ~ success** müvəffəqiyyəti qabaqcadan görmək

**envoy** ['envɔɪ] *n* **1.** diplomatik nümayəndə *(səfirdən bir rütbə aşağı diplomatik vəzifə sahibi)*; **~s of good will** xoş məramlı diplomatik nümayəndələr; ~ **extraordinary and minister plenipotentiary** fövqəladə diplomatik nümayəndə və səlahiyyətli nazir; **temporary** ~ müvəqqəti nümayəndə; **2.** elçi, nümayəndə; müjdəçi

**envy**[1] ['envɪ] *n* **1.** paxıllıq, həsəd, qibtə; **in ~ of** *smb.* bir kəsə paxıllıqdan; **to feel ~ at the superior advantages of another** başqasının üstünlüyünə həsəd aparmaq; **2.** paxıllıq obyekti; *She was the envy of all her friends Bütün dostları ona həsəd aparırdı*

**envy**[2] ['envɪ] *v* paxıllıq etmək, həsəd aparmaq; **to ~ no man** heç kəsə paxıllıq etməmək; **to ~ a man for his courage** başqa adamın cəsarətinə həsəd aparmaq

**enwrap** [ɪn'ræp] *v* **1.** bükmək, sarımaq, çulğalamaq; *A shabby overcoat enwrapped him O, nimdaş paltoya bürünmüşdü;* **2.** *məc.* dalmaq, qapılmaq; **to be ~ed in slumber** yuxuya dalmaq; **to be ~ed in thoughts** fikrə qapılmaq/dalmaq

**epic**[1] ['epɪk] *n* epik poema; epopeya, qəhrəmannamə, qəhrəmanlıq dastanı; **national** ~ milli epos/dastan; *Homer's "Iliad" is a famous epic Homerin "İliada" əsəri məşhur epik poemadır*

**epic**[2] ['epɪk] *adj* **1.** epik, epos; ~ **poetry** epik poeziya; **2.** qəhrəman, igid, cəsur, şücaətli

**epical** ['epɪkl] *adj* epik, epos

**epicentra** ['episentə] *n* **epicentrum** *isminin cəm forması*

**epicentral** [,epɪ'sentrl] *adj* episentrik

**epicentre** [,epɪ'sentə] *n* = **epicentrum**

**epicentrum** [,epɪ'sentrəm] *n (pl* **-tra***)* episentr *(zəlzələdə)*

**epicure** ['epɪkjuə^r] *n* **1.** epikürçü *(Epikür fəlsəfəsi tərəfdarı)*; **2.** *məc.* zövq və nəşəni hər şeydən üstün tutan adam, kefcil, işrətpərəst; ~ **in reading** gözəl ədəbi zövqə malik olan adam

**Epicurean** [,epɪkju'rɪən] *n fəls.* epikürçü, Epikür tərəfdarı/məsləkdaşı/ardıcılı

**epidemic**[1] [,epɪ'demɪk] *n* epidemiya *(hər hansı bir yoluxucu xəstəliyin geniş yayılması)*

**epidemic**[2] [,epɪ'demɪk] *adj* **1.** *tib.* yoluxma, yoluxucu; ~ **diseases** yoluxucu xəstəliklər; **2.** *məc.* ellik, ümumi, başdan-başa *(həvəs, şövq, maraq və s. haq.)*

**epidemical** [,epɪ'demɪkl] *adj* yoluxma, yoluxucu

**epidemiography** [,epɪ,di:mɪ'ɔgrəfɪ] *n* yoluxucu xəstəliklər haqqında elm

**epidemiologic** [,epɪ,di:mɪə'lɔdʒɪk] *n* epidemiologiya, epidemioloji; ~ **evidence** yoluxucu əlamət

**epidemiologist** [,epɪ,di:mɪ'ɔlədʒɪst] *n* epidemioloq *(epidemiologiya mütəxəssisi)*

**epidemiology** [,epɪ,di:mɪ'ɔlədʒɪ] *n* epidemiologiya *(yoluxucu xəstəliklərin törəyib yayılmasından və onların qarşısını alma üsullarından bəhs edən elm)*

**epidermic** [,epɪ'də:mɪk] *adj anat.* epidermik; ~ **tissue** heyvan dərisinin üst qatı

**epigram** ['epɪgræm] *n* **1.** epiqram *(qədim yunanlarda: qəbir daşında, ictimai binalarda və s. yadigar yazı)*; **2.** həcv

**epigrammatist** [,epɪ'græmətɪst] *n* həcvyazan, həcvçi

**epigrammatize** [,epɪ'græmətaɪz] *v* həcv yazmaq; **to ~ about** *smb.* bir kəs haqqında həcv yazmaq

**epigraph**[1] ['epɪgra:f] *n* epiqraf *(1) qədim yunanlarda: kitabə, qəbir daşları üzərində yazı; 2) bir əsərin başında və ya onun ayrı-ayrı fəsillərinin başında yazılan qısaca mətn; cümlə, zərbi-məsəl, hikmətli söz)*

**epigraph**[2] ['epɪgra:f] *v* epiqrafla təmin etmək, epiqraf vermək

**epilepsy** ['epɪlepsɪ] *n tib.* epilepsiya *(özündəngetmə xəstəliyinin bir növü)*

**epileptic**[1] [,epɪ'leptɪk] *n* epileptik *(epilepsiya xəstəliyinə tutulan)*

**epileptic**[2] [,epɪ'leptɪk] *adj tib.* **1.** epileptik, epileptika; ~ **attack/fit** özündəngetmə tutması; **2.** epilepsiyadan əzab çəkən

**epileptical** [,epɪ'leptɪkl] *adj* **1.** epileptik, epileptika; **2.** tutma *(ürəkkeçmə)*

**epileptiform** [,epɪ'leptɪfɔ:m] *adj tib.* epilepsiyaya oxşar

**epilogize** [e'pɪlədʒaɪz] *v* **1.** epiloq yazmaq; **2.** *məc.* son qoymaq *(bir şeyə)*

**epilogue** ['epɪlɔg] *n* **1.** epiloq; **2.** *məc.* son, xitam

**Epiphany** [ɪ'pɪfənɪ] *n* xaçın suya salınması günü *(xristian bayramlarından biri)*; xaç suyuna salma *(xristianlığa qəbul olunma mərasimi)*

**episcopacy** [ɪ'pɪskəpəsɪ] *n* **1.** yepiskopal idarə sistemi; **2.** yepiskopluq, yepiskop rütbəsi

**episcopal** [ɪ'pɪskəpl] *adj* **1.** yepiskop *(baş keşiş)*; **2.** yepiskopal; yepiskoplar tərəfindən idarə olunan



**episode** ['epɪsoud] *n* **1.** epizod, hadisə, əhvalat; **2.** intermediya *(dram tamaşasının iki pərdəsi arasında oynanılan kiçik komik əsər)*

**episodic** [,epɪ'sɔdɪk] *adj* **1.** epizodik; **2.** təsadüfi

**epistle** [ɪ'pɪsl] *n* **1.** müraciətnamə; namə, məktub; *Her mother sends her a long epistle every week Anası ona hər həftə uzun bir məktub/namə göndərir;* **2.** apostol müraciətnaməsi/məktubu

**epitaph** ['epɪta:f] *n* **1.** epitafiya *(məzar kitabəsi, başdaşı yazıları)*; **2.** qısa nekroloq

**epithet**[1] ['epɪθet] *n* epitet, ləqəb; ad; termin

**epithet**[2] ['epɪθet] *v* **1.** epitet vermək; epitetlə təmin etmək; **2.** adlandırmaq, ad vermək

**epitome** [ɪ'pɪtəmɪ] *n* **1.** konspekt, qısa şərh; **2.** çıxarış, sitat *(kitabdan və s.)*; **3.** xülasə, nəticə; **an ~ of** *one's* **life** həyatının nəticəsi

**epitomic** [,epɪ'tɔmɪk] *adj* **1.** qısa, müxtəsər, yığcam; **2.** xülasə edilən, yekun vurulan, yekunlaşdırılan

**epitomise** [ɪ'pɪtəmaɪz] *v* = **epitomize**

**epitomize** [ɪ'pɪtəmaɪz] *v* **1.** konspektləşdirmək, konspekt yazmaq; qısa şərh etmək/ vermək; ixtisar etmək *(əsəri)*; **2.** xülasə etmək, yekun vurmaq, yekunlaşdırmaq

**epoch** ['i:pɔk] *n* **1.** dövr, tarix, zaman, əsr; era *(tarixin başlanğıcı)*; **an ~ of scientific discoveries** elmi kəşflər əsri/dövrü; **2.** dönüş nöqtəsi *(tarixdə, həyatda və s.)*; **to mark an ~** yeni əsrə/dövrə başlamaq; **3.**: *geol.* **glacial** ~ buzlaq dövrü

**epochal** ['epɔkl] *adj* = **epoch-making**

**epoch-making** ['i:pɔk,meɪkɪŋ] *adj* dövr təşkil edən, çox mühüm/əhəmiyyətli/böyük; cahanşümul; ~ **discovery** cahanşümul əhəmiyyəti olan kəşf

**epopee** ['epoupi:] *n* epopeya *(qəhrəmanlıq dastanı)*; epik şerlər/əsərlər

**epos** ['epos] *n* **1.** epos, dastan; epik şerlər, **2.** epik poema; **3.** böyük hadisələr/qəhrəmanlıqlar

**equability** [,ekwə'bɪlɪtɪ] *n* **1.** bərabərlik, bir bərabərdə/ölçüdə/ qərarda olma; ~ **of the sun's motion** günəş hərəkətinin bərabərliyi; **2.** bir cürlük, eynilik, oxşarlıq; **3.** ağırlıq, müvazinət *(xasiyyətdə)*; ~ **of mind** xarakterdə müvazinət

**equable** ['ekwəbl] *adj* **1.** bərabər, eyni bərabərlikdə/bir bərabərdə/bir ölçüdə olan; sabit; ~ **pulse** nizamlı/ahəngli nəbz; ~ **climate** sabit iqlim/ab-hava; **2.** bir cür, yeknəsəq, eyni, bir formalı, oxşar; ~ **system of taxation** oxşar vergi sistemi; **3.** təmkinli, sakit, ağır; ~ **temper** sakit/ağır xarakter

**equableness** ['ekwəblnɪs] *n* = **equability**

**equal**[1] ['i:kwl] *n* tən, bərabər, eyni; tay, tay-tuş; **~s in age** yaşıdlar, həmyaşıdlar; **to have no ~ for wisdom** ağılda tay-bərabəri olmamaq; *He is not your equal O sənin/sizin tayın/ tayınız deyil*

**equal**[2] ['i:kwl] *adj* **1.** eyni, bir, bir cür, oxşar, tən, bərabər; ~ **parts** bərabər/eyni hissələr; ~ **distance** eyni/bərabər məsafə; ~ **rights** bərabər hüquqlar; **to be of ~ height** bir boyda olmaq; *Add an equal quantity of sugar Eyni qədərdə şəkər əlavə et/edin;* **2.** bərabərhüquqlu; ~ **partners** bərabərhüquqlu üzvlər *(cəmiyyətdə, müəssisədə)*; **3. (with, to)** geri qalmayan, ayaqlaşa bilən; ~ **in bravery to ancient heroes** qoçaqlıqda keçmişdəki qəhrəmanlardan geri qalmayan; *For wisdom, he was equal with his father Müdriklikdə o, atasından geri qalmırdı; All men are not equal in ability Qabiliyyətinə görə bütün insanlar eyni deyillər;* **4. (to)** bərabər, bərabər olan; *Four times five's equal to twenty Dörd dəfə beş iyirmiyə bərabərdir;* **5. (to)** bacaran, iqtidarlı, iqtidarlı olan, münasib, kara gələn; *He is not equal to the task O bu tapşırığın öhdəsindən gələ bilməz; I don't feel equal to it Mən bunu etmək iqtidarında deyiləm;* **6. (to)** uyğun, müvafiq; ~ **to demand** tələbə uyğun; ~ **to sample** nümunəyə uyğun/müvafiq

**equal**[3] ['i:kwl] *v* **(-ll-) 1.** geri qalmamaq, bərabər/eyni olmaq; *Peonies often equal roses in beauty Gözəllikdə pionlar (bəzək bitkisi) heç də qızılgüldən geri qalmır; He equals me in strength Gücdə o mənimlə bərabərdir/eynidir;* **2.** bərabərləşdirmək, bir/bərabər tutmaq, eyniləşdirmək, oxşatmaq; bərabərlik işarəsi qoymaq; **to ~ desertion with treason** fərariliyi satqınlığa bərabər tutmaq; *He equalled life with art O, həyatı incəsənətlə eyniləşdirirdi;* **3.** tən/tay/bərabər olmaq; **to ~** *smb's* **record** bir kəsin rekordunu təkrar etmək; **4.** yerlə yeksan etmək; dağıtmaq; *Cities were equalled to the ground Şəhərlər yerlə yeksan olmuşdu*

**equality** [ɪ'kwɔlɪtɪ] *n* **1.** bərabərlik; **the ~ of men** insanların bərabərliyi; **sovereign** ~ suveren bərabərlik; **absolute** ~ mütləq bərabərlik; **political/economic** ~ siyasi/ iqtisadi bərabərlik; ~ **before the law**, ~ **in the eye of law** qanun qarşısında bərabərlik; **on an ~ with** *smb.* bir kəslə bərabərlik əsasında; **2.** hüquq bərabərliyi, bərabər hüquq; **3.** bircürlük, eynilik, oxşarlıq; **4.** *riyaz.* bərabərlik

**equalize, -ise** ['i:kwəlaɪz] *v* **1.** bərabərləşdirmək; **to ~ in rights** hüquqca bərabərləşdirmək; **to ~ the score** *id.* hesabı bərabərləşdirmək; **to ~ education opportunities** təhsil imkanlarını bərabərləşdirmək; **2.** bir cür/ oxşar etmək, oxşatmaq; **to ~ the burden of taxation** eyni cür vergi qoymaq, vergi yükünü bərabərləşdirmək

**equalizer, -iser** ['i:kwəlaɪzə^r] *n* **1.** *tex.* bərabərləşdirici/tənləşdirici *(maşın)*; **2.** taraz, pərsəng; **3.** düzəldici sistem

**equally** ['i:kwəlɪ] *adv* **1.** bərabər; **to divide ~** bərabər bölmək; **2.** eyni dərəcədə; həmçinin, həbelə, eləcə də, bir qaydada /bərabərdə; **to be ~ binding** eyni dərəcədə vacib olmaq

**equanimity** [,i:kwə'nɪmɪtɪ] *n* soyuqqanlılıq; sakitlik, səbr, dözüm, iradə; **to bear misfortune with ~** bədbəxtliyi soyuqqanlılıqla qarşılamaq

**equanimous** [ɪ'kwænɪməs] *adj* 1. soyuqqanlı, ağır, təmkinli; sakit, təlaşa düşməyən, özünü itirməyən; 2. *arx.* qərəzsiz, tərəfgirlik etməyən, ədalətli, üz görməyən

**equate** [ɪ'kweɪt] *v* 1. bərabər hesab etmək, tənləşdirmək, bərabərləşdirmək, bir/bərabər tutmaq; **to ~ art with success** sənətkarlıqla müvəffəqiyyəti eyniləşdirmək; 2. *riyaz.* tənliyi müəyyən etmək; tənlik düzəltmək/tərtib etmək

**equation** [ɪ'kweɪʃn] *n* 1. tarazlaşdırma, tarazlaşdırılma, bərabərləşdirmə, bərabərləşdirilmə, tənləşmə, tənləşdirmə, tənləşdirilmə; **error ~** təqsirlərin/səhvlərin bərabərləşdirilməsi; **~ of condition** *fiz.* vəziyyətin bərabərləşdirilməsi; 2. ağırlıq, müvazinət *(xasiyyətdə)*, uyğunluq; **~ of demand and supply** *iqt.* tələb və təklifin uyğunluğu; 3. bərabərləşdirmə, bərabər tutma; 4. *riyaz.* tənlik; **simple ~** sadə tənlik; **second-degree ~** iki dərəcəli kvadrat tənlik; **to solve an ~** tənliyi həll etmək

**equator** [ɪ'kweɪtəʳ] *n* ekvator; **terrestrial ~** Yer ekvatoru; **north of the ~** ekvatordan şimala

**equatorwards** [ɪ'kweɪtəwədz] *adv* ekvatora tərəf, ekvator istiqamətində

**equerry** [ɪ'kwerɪ] *n* mehtərbaşı

**equestrian** [ɪ'kwestrɪən] *n* 1. atlı; at sürən; süvari *(əsgər)*; 2. sirkdə at sürən

**equilibrist** [ɪ'kwɪlɪbrɪst] *n* ekvilibrist, akrobat, sirk gimnastı, kəndirbaz, canbaz

**equilibrity** [ˌi:kwɪ'lɪbrɪtɪ] *n* = **equilibrium**

**equilibrium** ['i:kwɪ'lɪbrɪəm] *n (pl* **-ia)** 1. tarazlıq, müvazinət; **stable ~** sabit tarazlıq; 2. *məc.* ağırlıq, müvazinət *(xasiyyətdə)*; **to maintain *one's* ~** sakitliyi qoruyub saxlamaq; **to lose *one's* ~** müvazinətini itirmək; əsəbiləşmək, hirslənmək, hövsələdən çıxmaq

**equinoctial** [ˌi:kwɪ'nɔkʃl] *adj* 1. bərabərlik; **~ point** gecə-gündüz bərabərliyi; 2. *astr.* ekvator, ekvatordakı; **~ line** göy ekvator xətti

**equip** [ɪ'kwɪp] *v* **(-pp-)** 1. təchiz etmək *(avadanlıqla)*; silahlandırmaq; **to ~ a ship** gəmini təchiz etmək; **to ~ a plant** zavodu təchiz etmək; **to ~ with nuclear weapons** nüvə silahı ilə silahlandırmaq; 2. təmin etmək; *The travellers were well equipped Səyyahlar yaxşı təmin edilmişdilər*; 3. hazırlamaq, silahlandırmaq *(biliklə və s.)*: *He was ill equipped for such life Belə həyat üçün o, pis hazırlanmışdı*; **to ~ *one's* children with a good education** uşaqlarına yaxşı təhsil vermək; **to be ~ped for emergencies** fövqəladə vəziyyətlərə hazır olmaq

**equipment** [ɪ'kwɪpmənt] *n* 1. təchiz etmə/ edilmə; *The equipment of the laboratory took much time Laboratoriyanın təchiz edilməsi çox vaxt apardı*; 2. avadanlıq; təchizat, ləvazimat; aparat; **rescue ~** *id.* xilasetmə ləvazimatı/avadanlığı; 3. *hərb.* döyüş texnikası; 4. *d.y.* dəmiryol nəqliyyatı vasitələrinin hamısı *(vaqonlar, parovozlar və s.)*

**equipotent** [ˌi:kwɪ'poutnt] *adj* eyni güclü, qüvvəcə bərabər, bərabər qüvvəli/qüvvəyə malik

**equitable** ['ekwɪtəbl] *adj* insaflı, ədalətli; qərəzsiz, bitərəf; **~ conditions** ədalətli şərtlər; **~ treaty** ədalətli müqavilə

**equitableness** ['ekwɪtəblnɪs] *n* insaf, ədalət; haqq; qərəzsizlik, bitərəflik, üzgörməzlik

**equity** ['ekwɪtɪ] *n* 1. insaf, ədalət; haqq; qərəzsizlik, bitərəflik; 2. ədalət hüququ; **~ of redemption** əmlakı girovdan çıxartma hüququ; 3. *pl* ədalət məhkəməsi tərəfindən qəbul edilmiş hüquq; 4. *iqt.* adi aksiya/səhm, dividenti qəti müəyyən edilməmiş aksiya

**equivalence** [ɪ'kwɪvələns] *n* ekvivalentlik, bərabərlik; bərabər qiymətdə olma, eyni əhəmiyyətə malik olma

**equivalent**[1] [ɪ'kwɪvələnt] *n* 1. ekvivalent; qiymətcə bərabər olan əvəzedici; **the exact ~ of the English word "home"** ingiliscə **home** sözünün dəqiq ekvivalenti; 2. *şahm.* kompensasiya

**equivalent**[2] [ɪ'kwɪvələnt] *adj* 1. qiymətcə bərabər, bərabər qiymətli; *What is $5 equivalent to in French money? 5 dolları fransız puluna çevirdikdə nəyə bərabər olur?*; 2. *riyaz.* səthinə görə bərabər

**equivocal** [ɪ'kwɪvəkl] *adj* 1. ikimənalı, iki mənaya malik olan; aydın/açıq olmayan, anlaşılmaz; **an ~ answer** qeyri-müəyyən cavab; 2. şübhəli, şübhəyə səbəb olan; *Their sentiments were not equivocal Onların hisslərinə şübhələnməmək olardı*; **an ~ mode of life** şübhəli həyat tərzi

**equivocality** [ɪˌkwɪvə'kælɪtɪ] *n* 1. ikimənalılıq; 2. şübhəlilik; 3. qeyri-müəyyənlik

**equivocate** [ɪ'kwɪvəkeɪt] *v* ikimənalı/qeyri-müəyyən tərzdə danışmaq; boyun qaçırmaq *(cavabdan)*

**equivocation** [ɪˌkwɪvə'keɪʃn] *n* 1. boyun qaçırma *(cavabdan)*; 2. qeyri-müəyyən cavab; ikimənalı təsdiq

**-er** [ə] *suff* I 1. *Birhecalı və bəzi ikihecalı sifətlərin müqayisə dərəcə formasını düzəltmək üçün işlədilir*: **long** uzun, long**er daha** uzun; **short** qısa short**er daha** qısa; **clever** ağıllı, clever**er daha** ağıllı, **narrow** dar, narrow**er daha** dar *və s.*; 2. *Birhecalı zərflərin müqayisə dərəcə formasını düzəltmək üçün işlədilir:* **fast** tez, fast**er daha** tez; **early** erkən, earli**er daha** erkən

**-er** [ə] *suff* II 1. *Fel köklərindən şəxs, işin icraçısını bildirən isim düzəltmək üçün işlədilir*: **to paint** şəkil çəkmək, paint**er** rəssam; **to sing** oxumaq, sing**er** müğənni; 2. *Məşğuliyyət bildirən isimlərdə işlədilir*: philosoph**er** filosof, garden**er** bağban

**era** ['ɪərə] *n* 1. dövr; əsr; **the Elizabethan ~** Yelizaveta dövrü; **the Common Era** Bizim əsr; 2. tarix, era; **in the year 570 of our ~** bizim eranın 570-ci ilində; **in the Christian Era** Xristian tarixinə görə





**eradiate** [ɪ'reɪdɪeɪt] *v* buraxmaq, saçmaq, yaymaq *(şüa, işıq, isti)*

**eradiation** [ɪˌreɪdɪ'eɪʃn] *n* buraxma, saçma, yayma *(şüa, işıq, isti)*

**eradicate** [ɪ'rædɪkeɪt] *v* 1. kökündən çıxartmaq; 2. *məc.* kökünü kəsmək/üzmək, aradan qaldırmaq; **~ illiteracy** savadsızlığı aradan qaldırmaq; *Smallpox has now been eradicated İndi artıq çiçək xəstəliyinin kökü kəsilib;* 3. alağını vurmaq/təmizləmək

**eradication** [ɪˌrædɪ'keɪʃn] *n* 1. kökündən çıxartma; 2. *məc.* kökünü kəsmə, məhv etmə, aradan qaldırma; 3. alağını vurma/ təmizləmə

**erasable** [ɪ'reɪsəbl] *adj* 1. təmizlənə bilən *(rezinlə, pozanla, bıçaq vasitəsilə)*, təmizlənən; 2. azömürlü *(xatirə və s. haq.)*

**erase** [ɪ'reɪz] *v* 1. pozmaq, sürtüb təmizləmək, qaşımaq, qaşıyıb təmizləmək *(rezinlə, pozanla, bıçaqla)*; 2. *məc.* silmək, silib aparmaq/yox etmək; 3. yadından çıxarmağa çalışmaq, fikrindən silmək; 4. yer üzündən götürmək, məhv etmək, külünü göyə sovurmaq

**erasement** [ɪ'reɪzmənt] *n* 1. silmə, pozma *(rezinlə, pozanla, bıçaqla)*, qaşıma, qaşıyıb təmizləmə; 2. silmə, pozulmuş yer *(mətndə)*

**eraser** [ɪ'reɪzəʳ] *n* 1. rezin, pozan; **pencil ~** karandaş yazısını pozan rezin; **hard ~** mürəkkəb pozan rezin; 2. qaşıyıb təmizləmək üçün bıçaq; 3. lövhəni silmək üçün əski/silgi

**erect**[1] [ɪ'rekt] *adj* 1. düz; dik; vertikal, şaquli; **with head ~** başını dik tutaraq; **with ears ~** diqqətlə qulaq asaraq, qulaqlarını şəkləyərək; 2. biz-biz durmuş, ürpəşmiş *(saç, yun haq.)*

**erect**[2] [ɪ'rekt] *v* 1. tikmək, qurmaq, ucaltmaq; **to ~ a house** ev tikmək; **to ~ a temple** ibadətxana/məbəd tikmək; **to ~ a monument** abidə ucaltmaq; 2. hazırlamaq *(nəzəriyyə və s.)*; **to ~ a proposition** fikir /tezis irəli sürmək; 3. düzəltmək, qaldırmaq, dik vəziyyət vermək; **to ~ *one's* ears** diqqətlə qulaq asmaq, qulaqlarını şəkləmək; **to ~ oneself, to ~ *one's* body** dik durmaq/dikəlmək, şax durmaq; 4. təsis etmək, əsasını qoymaq; *Two courts were erected İki məhkəmə təsis olundu*; **to ~ a new government** yeni hökumət qurmaq; 5. montaj etmək, quraşdırmaq, yığmaq *(maşını)*

**erection** [ɪ'rekʃn] *n* 1. bina, qurğu, inşaat, tikinti, tikili; 2. düzəltmə, düzəldilmə; şaquli vəziyyətdə qurma/qaldırma *(sütun və s. haq.)*; 3. təsis etmə, yaratma *(təşkilat və s. haq.)*; 4. *tex.* quraşdırma *(maşın haq.)*; montaj etmə

**ermine**[1] ['ə:mɪn] *n* 1. *zool.* sincab *(çox qiymətli xəzi olan kiçik heyvan)*; 2. sincab xəzi; 3. hakimlərin dəyanət simvolu; **to assume/to wear the ~** hakim olmaq; *He was robed in ermine Onu hakim təyin etdilər*

**ermine**[2] ['ə:mɪn] *adj* sincab; **~ skin** sincab dərisi; **~ tips** sincab quyruqları; **~ white** ağappaq, qar kimi ağ

**erode** [ɪ'roud] *v* 1. yemək, korlamaq, xarab etmək *(pas, turşu və s. haq.)*; dağıtmaq, yıxmaq, uçurtmaq, məhv etmək *(tədricən)*; *Metals are eroded by acids Turşular metalları yeyir;* 2. *məc.* pozmaq, korlamaq, sarsıtmaq, qırmaq; 3. *geol.* aşınmaq *(külək, yağış və s. nəticəsində)*, yuyub aparmaq

**eroded** [ɪ'roudɪd] *adj geol.* yuyulmuş; aşınmış *(küləyin və s.-nin təsirilə)*; yuyulub getmiş, dağılmış

**erosion** [ɪ'rouʒn] *n* eroziya, aşınma, yemə, korlama, xarab etmə *(pas, turşu və s.)*; **soil ~** torpağın eroziyası

**erotic**[1] [ɪ'rɔtɪk] *n* 1. aşiqanə şer; 2. erotika *(1) şəhvətpərəstlik, şəhvani hiss; 2) aşiqanə şerlər)*

**erotic**[2] [ɪ'rɔtɪk] *adj* 1. eşq, aşiqanə; 2. şəhvani; ehtiraslı; **~ love** ehtiraslı məhəbbət

**erotica** [ɪ'rɔtɪkə] *n* 1. aşiqanə ədəbiyyat/ poeziya; 2. pornoqrafiya *(ədəbsiz səhnələri təsvir edən ədəbiyyat və ya şəkillər)*

**erotomania** [ɪˌrɔtə'meɪnjə] *n tib.* şəhvətpərəstlik, şəhvət düşkünlüyü

**err**[1] [ə:ʳ] *v* 1. səhv etmək, yanılmaq; *To err is human Səhv etmək insana xasdır*; **to ~ in *one's* judgement of circumstances** vəziyyəti düzgün qiymətləndirməməklə səhv etmək; 2. günah etmək, günaha batmaq, qələt etmək

**errand** ['erənd] *n* 1. tapşırıq, vəzifə, buyruq; **to go on an ~** buyruğa/tapşırıq dalınca getmək; **to send on an ~** tapşırığa/buyruğa göndərmək; **to run ~s** buyruq qulu olmaq, buyruqları yerinə yetirmək;

◊ **a fool's ~** faydasız əmək; **to send *smb.* on a fool's ~** bir kəsə mənasız tapşırıq vermək

**errant** ['erənt] *adj* 1. səyahət edən *(macəra axtarışında olan)*; 2. azan, çaşan, gəzən, dolaşan *(fikir və s. haq.)*; 3. azğın, əxlaqsız, düşük; yolunu azmış

**erratic** [ɪ'rætɪk] *adj* 1. dəyişkən, tərəddüd edən *(fikir və s. haq.)*; **~ temperature** dəyişkən temperatur; 2. dağınıq *(fikir haq.)*; 3. *iqt.* qeyri-bərabər, dəyişkən, qərarsız, tezdəyişən *(qiymət haq.)*; 4. qəribə; **~ behaviour** qəribə davranış

**error** ['erəʳ] *n* 1. səhv, yanılma; **human ~** insana xas səhv; **to make/to commit an ~** səhv etmək; yanılmaq; **to be in ~** səhv etmək, yanılmaq; **to lead *smb.* into ~** bir kəsi aldatmaq; **in ~** səhvən, səhv olaraq; 2. xəta, yanlış, günah, qələt; **spelling ~** orfoqrafiya xətası; **printer's ~** mətbəə xətası; **to eliminate the ~s** səhvləri aradan qaldırmaq; **appreciable/inappreciable ~** ciddi /cüzi xəta; 3. günah, suç, təqsir; **to repent *one's* ~s** qəbahətlərini/ günahlarını/suçlarını boynuna almaq

**errorful** ['erəfl] *adj* səhvi olan, yanlış, düzgün/doğru olmayan, səhvlə/xəta ilə dolu

**errorist** ['erərɪst] *n* səhv etməyə meylli adam

**errorless** ['erəlɪs] *adj* 1. səhvsiz, səhv olmayan; xətasız; 2. günahsız, suçsuz, təqsirsiz

**erudite**[1] ['erudaɪt] *n* erudit *(hər hansı bir sahədə geniş məlumatı olan adam)*, böyük erudisiyaya malik adam
**erudite**[2] ['erudaɪt] *adj* 1. erudit, hərtərəfli, geniş bilik sahibi olan; alim; 2. elmi *(kitab və s. haq.)*
**erudition** [.eru'dɪʃn] *n* erudisiya *(hər hansı bir sahədə dərin bilik, geniş məlumat)*; alimlik; hərtərəfli bilik, məlumatlılıq, biliklilik
**erupt** [ɪ'rʌpt] *v* 1. püskürmək *(vulkan haq.)*; 2. püskürmək, atmaq *(lava, kül və s.)*; 3. çıxmaq *(diş haq.)*; 4. zorla girmək, soxulmaq, yarıb keçmək, özünə yol açmaq; *The crowd erupted into the yard Camaat həyətə zorla soxuldu*
**eruption** [ɪ'rʌpʃn] *n* 1. püskürmə, atma *(vulkan, lava)*; 2. yarıb keçmə *(alov)*; 3. qəhqəhə/qəzəb səsi; 4. başlama, baş vermə *(epidemiya və s.)*; 5. zorla/basıb girmə, soxulma *(düşmən)*; 6. *tib.* səpmə, səpgi
**erysipelas** [.erɪ'sɪpɪləs] *n tib.* qızıl yel *(yoluxucu dəri xəstəliyi)*
**erythema** [.erɪ'θi:mə] *n tib.* eritema *(dəri damarlarının şişməsi nəticəsində dərinin qızarması)*.
**escalate** ['eskəleɪt] *v* 1. eskalatorla qalxmaq; 2. kəskinləşmək, gərginləşmək; kəskinləşdirmək, gərginləşdirmək *(münaqişəni, vəziyyəti)*; *The conflict was escalated Münaqişə kəskinləşdi/gərginləşdi; The conflict escalated into war Münaqişə kəskinləşib müharibəyə çevrildi*; 3. (**into**) düçar etmək; **to ~ the world into a war** dünyanı müharibəyə düçar etmək
**escalation** [.eskə'leɪʃn] *n* gərginləşmə, kəskinləşmə, genişləndirmə, kəskinləşdirmə *(münaqişəni və s.)*; **the danger of war ~** müharibənin genişlənmə təhlükəsi
**escalator** ['eskəleɪtə$^r$] *n* 1. eskalator; 2. *amer. məc.* pillə, sıra, silsilə; **the social ~** ictimai/sosial pillə
**escape**[1] [ɪs'keɪp] *n* 1. qaçma, qaçış, qaçaqaç; **to make good** ***one's*** **~** uğurlu qaçış etmək; 2. adamlardan qaçma, qapanıb qalma; 3. qurtuluş, xilas olma, qurtulma, nicat vermə; **to have a narrow/hair-breadth ~** təhlükədən güclə xilas olmaq; 4. *arx.* səhv, yanlış, xəta, diqqətsizlik
**escape**[2] [ɪs'keɪp] *v* 1. həbsxanadan qaçmaq; 2. qurtarmaq, xilas olmaq *(təhlükədən və s.)*, canını qurtarmaq, nicat tapmaq, qurtulmaq, yaxasını qurtarmaq; **to ~ a blow** zərbədən yayınmaq/xilas olmaq; **to ~ observation** nəzarətdən yayınmaq; **to ~ punishment** cəzadan xilas olmaq/canını qurtarmaq; 3. qaçmaq, aradan çıxmaq, yox olmaq, itmək *(mənə və s. haq.)*; *Your point escapes me Başa düşmürəm, nəyə işarə edirsən/edirsiniz; The details escape my mind Təfsilatlar yadımdan çıxır*; 4. ağızdan qaçmaq *(söz)*
**escapeless** [ɪs'keɪplɪs] *adj* 1. labüd, qaçılmaz, zəruri; 2. qaçmaq üçün çıxış yolu olmayan
**escaper** [ɪs'keɪpə$^r$] *n* qaçaq, qaçqın

**escort**[1] ['eskɔ:t] *n* 1. mühafizə/keşikçi dəstəsi; qarovul, keşikçi; müşayiət, müşayiət etmə, svita *(böyük şəxsin müşayiətçiləri)*; 2. cangüdən; fəxri qarovulun üzvü; **mounted ~s** atlı mühafizə dəstəsi; 3. *hərb.* mühafizə dəstəsi; 4. *amer.* kavaler, partnyor; **young ladies and their ~s** gənc xanımlar və onların kavalerləri
**escort**[2] [ɪs'kɔ:t] *v* 1. müşayiət etmək; yola salmaq, ötürmək *(fəxri qonağı)*; **to ~ a lady to her home** xanımı evinə (qədər) ötürmək; 2. *hərb.* mühafizə dəstəsi qoşmaq, yanınca getmək *(mühafizə üçün)*; 3. *hüq.* müşayiət etmək *(dustağı)*
**escutcheon** [ɪs'kʌtʃn] *n* 1. gerb; gerb üzərində qalxan; 2. *arx.* üzərində gerb olan xatirə lövhəsi; 3. ornamentli qalxan; 4. üzərində gəminin adı olan lövhə
**esemplastic** [.esem'plæstɪk] *adj* birləşdirən, birliyə kömək edən
**Eskimo** ['eskɪmou] *n (pl* **-os**[-ouz]) 1. eskimos; **the ~(s)** *top. i* eskimoslar; 2. qırmızımtıl-qəhvəyi rəng
**esoteric** [.esou'terɪk] *adj* gizli, gizlin, məxfi; **~ purpose** gizli məqsəd
**especial** [ɪs'peʃl] *adj* 1. xüsusi, ayrı, əlahiddə, məxsus; **a matter of ~ importance** xüsusi əhəmiyyət kəsb edən məsələ; 2. müstəsna, ən yaxşı; **his ~ friend** onun ən yaxşı dostu; 3. konkret, konkret olaraq; *This has no especial reference to any person Bu, konkret olaraq heç kəsə aid deyil*;
◊ **in ~** xüsusilə, o cümlədən, məsələn, konkret olaraq
**especially** [ɪs'peʃəlɪ] *adv* 1. xüsusilə, xüsusən; *The criticism is especially deserved in this case Belə halda tənqid xüsusilə təqdirəlayiqdir*; 2. başlıca olaraq, əsasən; **~ for this reason** əsasən/başlıca olaraq, bu səbəbə görə; 3. xüsusilə, o cümlədən
**Esperanto** [.espə'ræntou] *n* esperanto *(süni beynəlxalq dil)*
**espionage**[1] [.espɪə'na:ʒ] *n* casusluq
**espionage**[2] [.espɪə'na:ʒ] *adj* casus; **~ ring** casus təşkilatı
**espouse** [ɪs'pauz] *v* müdafiə etmək *(fikri, nəzəriyyəni və s.)*; özünü həsr etmək *(işə və s.)*; **to ~ the cause of peace** sülh işini müdafiə etmək; **to ~ a party** partiyanı müdafiə etmək
**espy** [ɪs'paɪ] *v* 1. uzaqdan görmək; 2. görmək, müəyyən etmək *(nöqsanı, qüsuru)*
**essay**[1] ['eseɪ] *n* 1. oçerk, etüd, esse; 2. təşəbbüs, sınaq, təcrübə
**essay**[2] ['eseɪ] *v* 1. sınaqdan çıxarmaq, sınamaq, yoxlamaq; **to ~** ***one's*** **power** öz qüvvəsini yoxlamaq; 2. səy/cəhd etmək, çalışmaq; **to ~ a task** öz üzərinə çətin vəzifə götürmək
**essayist** ['eseɪɪst] *n* 1. esseist, esse/oçerk yazan
**essence** ['esns] *n* 1. mahiyyət, məğz; məna, mətləb; **the ~ of the proposal** təklifin mahiyyəti/məğzi; **in ~** həqiqətdə, əslində, əslinə baxanda; 2. *fəls.* substrat *(əsas)*; 3. cövhər, esensiya, şirə, ekstrakt; 4. can, vücud, məxluq, insan; **heavenly ~s** ilahi məxluqlar
**essential**[1] [ɪ'senʃl] *n* 1. *pl* mahiyyət, məğz, əsas, məna, mətləb, ayrılmaz hissə; başlıca, ən əsas; **to learn ~s of English grammar** ingilis dilinin qrammatikasının əsaslarını öyrənmək; *On these essentials they will back him Bu əsas məsələlərdə onlar onu müdafiə edəcəklər*; **to come down to ~s** məsələnin mahiyyətinə keçmək; 2. ilk növbədə lazım olan zəruri əşyalar; 3. *hərb.* əsas təchizat əşyaları
**essential**[2] [ɪ'senʃl] *adj* 1. vacib, zəruri, labüd, məcburi, gərəkli, lazımi; **~ condition** vacib/zəruri şərt; *Water is essential to life Həyat üçün su vacibdir; Disarmament is essential for the progress of mankind Bəşəriyyətin tərəqqisi üçün tərksilah vacibdir*; 2. əsas; **~ part of his character** onun xarakterinin əsas xüsusiyyəti; 3. əhəmiyyətli, çox mühüm; **~ service** çox mühüm xidmət;
◊ **~ goods** zəruri tələbat malları
**essentially** [ɪ'senʃəlɪ] *adv* 1. həqiqətdə, əslində, əslinə qalsa/baxanda; **~ negative approach** əslində mənfi münasibət; 2. əhəmiyyətli, vacib, mühüm; *The new model differs essentially from the old one Yeni model köhnə modeldən əhəmiyyətli dərəcədə fərqlənir*
**establish** [ɪs'tæblɪʃ] *v* 1. təsis/təşkil etmək; **to ~ a newspaper** qəzet təsis etmək; **to ~ a state** dövlət qurmaq; **to ~ an international organization** beynəlxalq təşkilat təsis etmək; 2. qurmaq, düzəltmək, təyin/ təşkil etmək, yaratmaq; **to ~ order** nizam /qayda yaratmaq; **to ~ a price in the market** bazarda qiymət təyin etmək; **to ~ relations** əlaqə yaratmaq; 3. möhkəmləndirmək, bərkitmək, təsdiq etmək; **to ~** ***one's*** **health/reputation** səhhətini/şöhrətini möhkəmləndirmək; 4. müəyyən etmək, aydınlaşdırmaq; **to ~** ***smb.'s*** **whereabouts** bir kəsin olduğu yeri müəyyən etmək; **to ~ the cause of death** ölümün səbəbini müəyyən etmək; 5. təyin etmək *(vəzifəyə və s.)*; 6. sübut etmək; **to ~ a case** vəziyyəti sübut etmək; **to ~ a fact** faktı sübut etmək; **to ~** ***smb's*** **guilt/innocence** bir kəsin təqsirini/günahsızlığını sübut etmək
**established** [ɪs'tæblɪʃt] *adj* 1. müəyyən/sübut edilmiş; **an ~ fact** sübut edilmiş fakt; 2. möhkəmləndirilmiş, kök salmış; **the ~ order** kök salmış quruluş; **~ custom** kök salmış adət; 3. məşhur, mötəbər; **~ authority** məşhur avtoritet, nüfuzu/hörməti/etibarı olan adam; **~ author** məşhur yazıçı/müəllif
**establisher** [ɪs'tæblɪʃə$^r$] *n* bani, təsis edən, əsasını qoyan, müəssis, yaradan, yaradıcı



**establishment** [ɪs'tæblɪʃmənt] *n* 1. müəyyən etmə/edilmə, təyin etmə/edilmə, özül/bünövrə qoyma, təsis/təşkil etmə, yaratma; **the ~ of a new State** yeni dövlətin təsis edilməsi; 2. idarə, müəssisə, təşkilat; 3. elmi tədqiqat müəssisəsi; 4. cəmiyyətdə möhkəm mövqe; yoluna qoyulma, düzəltmə, təşkil etmə/edilmə; 5. təsərrüfat, ailə, ev; **to keep a splendid ~** ağa kimi/firavan yaşamaq; 6. *hərb.* şəxsi heyətin ştatı; **peace/war ~** əmin-amanlıq/müharibə dövrünün ştatı; **to be up to ~** tam ştata malik olmaq
**estate**[1] [ɪs'teɪt] *n* 1. mülk, malikanə; 2. mal, var, dövlət; **personal/real ~** daşınan/daşınmaz əmlak; **~ for life** *hüq.* ömürlük əmlaka malik olma; 3. silk, təbəqə, zümrə; **the ~s of the realm** krallıq zümrələri *(İngiltərədə)*; 4. vəziyyət; **the ~ of matrimony** qanuni nikah/kəbin; **to suffer in** ***one's*** **~** öz vəziyyətindən bezmək/cana gəlmək/doymaq
**estate**[2] [ɪs'teɪt] *v* bağışlamaq, hədiyyə etmək / vermək, bəxşiş / mükafat vermək *(malikanə və s.)*
**esteem**[1] [ɪs'ti:m] *n* hörmət, ehtiram; **to hold in ~** hörmət etmək/bəsləmək; **to be held in ~** hörmətə malik olmaq
**esteem**[2] [ɪs'ti:m] *v* 1. hörmət etmək/göstərmək, ehtiram göstərmək, hörmətlə qeyd etmək/anmaq; yüksək qiymətləndirmək; **to ~ learned men** elm adamlarına hörmət etmək; 2. güman/hesab etmək; **to ~ a theory useless** nəzəriyyəni faydasız hesab etmək
**esteemer** [ɪs'ti:mə$^r$] *n* ehtiram edən, hörmət bəsləyən; pərəstiş edən, pərəstişkar, aşiq
**estimable** ['estɪməbl] *adj* hörmətli, hörmətə layiq; möhtərəm
**estimate**[1] ['estɪmɪt] *n* 1. qiymət, qiymət qoyma, fikir, rəy; **to form an ~** fikir yaratmaq, qiymətləndirmək *(vəziyyəti və s.)*; 2. smeta *(nəzərdə tutulan xərclərin cədvəli)*; kalkulyasiya *(malın maya və satış qiymətinin hesablanması)*, hesablama; ilkin hesablama; **~ for funds** pul buraxmaq üçün smeta; **by ~** smeta üzrə, ilkin hesablamaya görə; 3. *pl* smeta haqqında/smetaya dair fikir/rəy; **budgetary ~s** büdcəyə dair fikirlər/rəylər
**estimate**[2] ['estɪmeɪt] *v* 1. qiymətləndirmək, qiymətini təyin etmək; **to ~ the value of a gem** daş-qaşın qiymətini müəyyənləşdirmək / müəyyən etmək; 2. mühakimə yürütmək, fikir söyləmək; **to ~ the powers of an author** yazıçının istedadı/ imkanları haqqında fikir söyləmək; 3. smeta tərtib etmək, təxmini hesablamaq
**estimated** ['estɪmeɪtɪd] *adj* 1. təxmin/güman edilən, təxmini; **~ readership** təxmini oxucu; **~ casualties** güman edilən itkilər, insan tələfatının təxmini sayı *(qəza nəticəsində)*; 2. hesablanmış, smeta üzrə olan; güman edilən, nəzərdə tutulmuş; **~ amount** hesablanmış/nəzərdə

tutulmuş miqdar; ~ **cost** smeta üzrə qiymət; ~ **profit** smeta üzrə olan gəlir

**estimation** [ˌestıˈmeıʃn] *n* 1. qiymət, qiymət qoyma/vermə, fikir, mülahizə; **in my ~** mənim fikrimcə; **in the ~ of most people** əksər camaatın güman etdiyi kimi; 2. hörmət; **to hold in ~** hörmət etmək; 3. hesablama; kalkulyasiya; smeta; **ocular ~** gözlə müəyyən etmə/hesablama *(məsafəni)*

**estimator** [ˈestımeıtər] *n* qiymət qoyan/təyin edən

**estrange** [ıˈstreındʒ] *v* 1. uzaqlaşdırmaq, özgələşdirmək, yadlaşdırmaq; *His foolish behaviour estranged all his friends Onun axmaq davranışı bütün dostlarını ondan uzaqlaşdırdı*; 2. ayrılmaq, ayrı yaşamaq *(arvadından, ərindən); They have been estranged for a year Onlar bir ildir ki, ayrı yaşayırlar/ayrılıblar*

**estrangement**[ıˈstreındʒmənt] *n* 1. yadlaşma, özgələşmə, soyuma; 2. ayrılma, ayrı yaşama

**etch** [etʃ] *v* 1. oymaq, qazımaq, həkk etmək, naxış açmaq *(metal, şüşə üzərində)*; 2. *məc.* silinməz iz qoymaq/buraxmaq; **to be ~ed in *one's* memory** hafizəsinə həkk olmaq, yaddaşında iz buraxmaq; 3. yemək, korlamaq, xarab etmək *(turşu və s. haq.)*

**etched** [etʃt] *adj* 1. oyulmuş, qazılmış, həkk edilmiş, naxış açılmış, aşındırılmış; 2. *məc.* həkk olunmuş, silinməz iz buraxmış

**etcher** [ˈetʃər] *n* oymaçı; aşındırıcı *(kimyəvi üsul ilə metal üzərində naxış açan usta)*; **dot ~** oymaçı-aşındırıcı

**etching** [ˈetʃıŋ] *n* 1. oyma, həkk etmə; aşındırma, kimyəvi üsul ilə naxış açma; 2. qravyura; oyulmuş şəkil; 3. kimyəvi üsulla təmizləmə *(turşu ilə)*

**etching-needle** [ˈetʃıŋni:dl] *n* oyma iynəsi

**eternal**[1] [ıˈtə:nl] *n* 1. **(the ~)** daim, əbədi, ömürlük; 2. **the Eternal** Allah; 3. əbədilik, daimilik; **from time ~** qədimdən, əzəldən/qədimdən bəri

**eternal**[2] [ıˈtə:nl] *adj* 1. həmişəlik, əbədi, ömürlük, ölməz; həmişəyaşar; nəhayətsiz *(vaxt hesabilə)*; **~ life** əbədi həyat, ölməzlik, əbədilik; **~ punishment** əbədi əzab/cəza, cəhənnəm əzabı; **~ God** əbədi Allah; *Matter is eternal Materiya əbədidir;* 2. daimi, dəyişməyən, dəyişməz, əbədi; **~ truths** əbədi həqiqətlər; 3. qurtarmaq bilməyən; sonsuz; **their ~ chatter** onların qurtarmaq bilməyən boşboğazlığı

**eternity** [ıˈtə:nıtı] *n* 1. əbədilik, daimilik; 2. daimi /əbədi həyat, ölməzlik, axirət dünyası; **to send *smb.* into ~** bir kəsi o dünyaya göndərmək;

◊ **from all ~** qədimdən, əzəldən/ qədimdən bəri; **for all ~** həmişə, həmişəlik, daim

**eternity-box** [ıˈtə:nıtıbɔks] *n jarq.* tabut, qəbir, gor

**eternize** [i:ˈtə:naız] *v* 1. əbədiləşdirmək; daimi /tükənməz/sonsuz etmək; **to ~ woe** kədəri əbədiləşdirmək; 2. əbədi/ölməz şöhrət vermək

**ethanol** [ˈeθənɔl] *n kim.* etil spirti

**ether** [ˈi:θər] *n* 1. *kim.* efir; 2. *d.d.* efir, radio; **over the ~** efir vasitəsilə, radio ilə; **~ wave** radio dalğası

**ethical** [ˈeθıkl] *adj* əxlaqlı, etik, etikaya aid; **~ person** əxlaqlı adam; **~ system** etik sistem; **~ thinkers** etik mütəfəkkirlər *(etik məsələlərin işlənib hazırlanması ilə məşğul olanlar)*; **~ principles** etik prinsiplər; **~ code** əxlaq kodeksi/normaları; *This is not ethical Bu əxlaqdan kənardır*

**ethicality** [ˌeθıˈkælıtı] *n* əxlaqilik, əxlaq qaydalarına uyğunluq

**ethicize** [ˈeθısaız] *v* 1. öyüd/nəsihət etmək; etik məsələləri müzakirə etmək; 2. əxlaqlı etmək

**ethics** [ˈeθıks] *n* 1. etika, əxlaq nəzəriyyəsi; **a code of ~** əxlaq kodeksi; **the ~ of Aristotle** Aristotel etikası, etika haqqında Aristotel təlimi; 2. etika, əxlaq, tərbiyə, əxlaq qaydaları, əxlaq qaydalarına uyğunluq; **medical ~** tibbi etika; **doubtful ~** şübhəli əxlaq; 3. qəbul olunmuş davranış normaları; ədəb, ərkan, ədəb-ərkan, tərbiyə; **the ~ of dining** süfrə etikası

**ethnic** [ˈeθnık] *adj* 1. etnik; 2. *arx.* bütpərəstlik

**ethnical** [ˈeθnıkl] *adj* = **ethnic**

**ethnically** [ˈeθnıkəlı] *adv* etnik; əhalinin etnik tərkibi haqqında

**ethnicism** [ˈeθnısızm] *n arx.* bütpərəstlik

**ethyl** [ˈeθıl] *n kim.* etil; **~ alcohol** şərab spirti

**etiology** [ˌi:tıˈɔlədʒı] *n tib.* etiologiya *(xəstəliyin səbəbləri haqqında elm; hər hansı bir xəstəliyi törədən səbəblər)*

**etiquette** [ˌetıˈket] *n* 1. etiket; mərasim; 2. ictimai yerlərdə davranış qaydaları; nəzakət / qonaqpərəstlik normaları; **the ~ governing the setting of a table for a formal dinner** rəsmi nahar üçün süfrənin hazırlanma/düzmə *(qab-qacağı, yemək-içməyi)* qaydaları; 3. ədəb, tərbiyə, nəzakət, xoş xasiyyət, adət; *That is not etiquette Bu, nəzakətsizlikdir*

**etude** [eıˈtju:d] *n fr mus.* etüd

**etymologer** [ˌetıˈmɔlədʒər] *n* etimoloq *(etimologiya mütəxəssisi)*

**etymologic** [ˌetıməˈlɔdʒık] *adj dilç.* = **etymological**

**etymological** [ˌetıməˈlɔdʒıkl] *adj dilç.* etimoloji; **~ dictionary** etimoloji lüğət

**etymologist** [ˌetıˈmɔlədʒıst] *n dilç.* etimoloq

**etymology** [ˌetıˈmɔlədʒı] *n dilç.* etimologiya *(dilçiliyin sözlərin mənşəyindən bəhs edən şöbəsi)*; 2. hər hansı bir sözün mənşəyi

**eulogy** [ˈju:lədʒı] *n* 1. məhvedici/tərifləyici nitq; xidmətlərin həddən artıq təriflənməsi; 2. qəbirüstü söz

**eureka** [juˈri:kə] Evrika! Tapdım! *(sevinc bildirir)*



**European**[1] [ˌjuərəˈpi:ən] *n* 1. avropalı; 2. ağ irqə mənsub olan adam

**European**[2] [ˌjuərəˈpi:ən] *adj* 1. Avropa; **the ~ Recovery Plan** *tar.* Avropanın bərpa edilməsi planı, Marşal planı; 2. ağ, ağ irqə mənsub; **a ~ non-European** Avropalı qaradərili; **an American ~** ağ irqə mənsub amerikan

**evacuable** [ıˈvækjuəbl] *adj* asan daşınıla bilən; miniklə daşımaq üçün münasib

**evacuant**[1] [ıˈvækjuənt] *n tib.* işlətmə dərmanı

**evacuant**[2] [ıˈvækjuənt] *adj tib.* işlətmə; boşaltmaya səbəb olan; **~ enema** təmizləyici imalə

**evacuate** [ıˈvækjueıt] *v* 1. boşaltmaq, köçürtmək *(əhalini, yaralıları və s.)*; **to ~ the civilians** mülki əhalini köçürtmək; 2. köçmək, köçürülmək, boşaldılmaq; 3. *hərb.* çıxartmaq *(qoşunu)*; tərk etmək *(yeri); The garrison evacuated the fort Qarnizon istehkamı tərk etdi*; 4. *tib.* boşaltmaq, təmizləmək; 5. *tex.* nasosla çıxartmaq *(havanı)*, vakuum yaratmaq; 6. *arx.* ləğv etmək, geri götürmək, etibarsız hesab etmək; **to ~ a marriage** nikahı etibarsız hesab etmək

**evacuation** [ıˌvækjuˈeıʃn] *n* 1. boşaltma, boşaldılma, köçürülmə *(əhalini, yaralıları və s.)*; 2. çıxardılma/çıxarma *(qoşunu)*; **~ by road** avtomobil nəqliyyatı vasitəsilə köçürmə/çıxarma; 3. *tib.* boşaltma, təmizləmə; 4. *tex.* nasosla çıxartma *(havanı)*, vakuum yaratma; 5. ləğv/etibarsız hesab etmə

**evade** [ıˈveıd] *v* 1. qaçmaq *(təqibdən və s.)*; 2. özünü gözləmək *(şübhədən, cəzadan)*; 3. boyun qaçırmaq *(cavabdan, sualdan)*; 4. yayınmaq; **to ~ service** hərbi xidmətdən yayınmaq; 5. nəzərə almamaq *(qanunu və s.)*; 6. *id.* aldatmaq *(rəqibi)*; **to ~ the block** maneənin üstündən/ yanından keçmək *(voleybol oyununda)*

**evader** [ıˈveıdər] *n* yayınmış adam *(əsasən hərbi xidmətdən)*

**evaluable** [ıˈvæljuəbl] *adj* 1. qiymət qoyula bilən; 2. hesaba gələn, hesablana bilən

**evaluate** [ıˈvæljueıt] *v* 1. qiymətləndirmək, qiymət qoymaq, qiyməti təyin etmək; 2. miqdarı/sayı təyin etmək; 3. qiymət vermək; keyfiyyəti/əhəmiyyəti müəyyən etmək; **to ~ the full significance** tam əhəmiyyətini/rolunu qiymətləndirmək; **to ~ a work of art** incəsənət əsərinə qiymət vermək; 4. *riyaz.* hesablamaq; **to ~ the altitude of a star** ulduzun yüksəkliyini hesablamaq

**evaluation** [ıˌvæljuˈeıʃn] *n* 1. qiymət, qiymət qoyma/vermə, miqdarını/sayını/keyfiyyətini təyin etmə; məlumatın/vəziyyətin təhlili; 2. hesab, hesablama; qiyməti təyin etmə

**Evangel** [ıˈvændʒel] *n din.* İncil

**evangelic** [ˌi:vænˈdʒelık] *adj* 1. incil; 2. protestant

**evangelical** [ˌi:vænˈdʒelıkl] *n* yevangel kilsələrindən birinin tərəfdarı; protestant

**evangelist** [ıˈvændʒılıst] *n* 1. yevangelist *(1) incilin xəyali müəllifi; 2) yevangelist təriqətinə mənsub adam)*; 2. dörd incildən birinin müəllifi; 3. incilin təbliğçisi; missioner *(xristianlığı yaymaq üçün xristian olmayan xalqlar arasına göndərilən təbliğatçı)*; 4. təbliğçi, apostol *(1) həvariyyun, əshabə; 2) İsanın əfsanəvi 12 həvariyyunundan biri)*; 5. həvarilərdən bəhs edən dini kitab

**evaporability** [ıˌvæprəˈbılıtı] *n* buxarlanma qabiliyyəti

**evaporable** [ıˈvæprəbl] *adj* buxarlanan

**evaporate** [ıˈvæpəreıt] *v* 1. buxarlandırmaq, buğlandırmaq, buxara/buğa çevirmək; 2. buxarlanmaq, buğ almaq, buxar halına keçmək; 3. buğa/buxara vermək, buğa verib təmizləmək; susuzlaşdırmaq, suyunu çəkmək/qurutmaq; qatılaşdırmaq *(südü)*; 4. itmək, qeyb/yox olmaq; *His anger evaporated Onun qəzəbi yox oldu; His hopes evaporated Onun ümidləri yoxa çıxdı*

**evaporated milk** [ıˈvæpəreıtıdmılk] *n* qatılaşdırılmış/sterilləşdirilmiş süd

**evaporation** [ıˌvæpəˈreıʃn] *n* 1. buxarlanma, buğlanma; 2. buxar əmələ gəlmə; buxara çevrilmə; 3. buxarlandırılma/buxarlandırma; suyunu çəkmə; 4. qatılaşdırma

**evaporator** [ıˈvæpəreıtər] *n* buxarlandırıcı/ buğlandırıcı cihaz

**evasion** [ıˈveıʒn] *n* 1. boyun qaçırma; 2. nəzərə almama, riayət etməmə *(qanuna və s.)*; 3. hiylə, kələk, biclik, fənd; bəhanə, qeyri-müəyyən cavab; **~s and delays** bəhanələr və təxirlər

**evasive** [ıˈveısıv] *adj* 1. qeyri-müəyyən, qeyri-səmimi, ikimənalı; **~ answers** qeyri -müəyyən cavablar; **~ promises** qeyri-müəyyən/qeyri-səmimi vədlər; 2. ələkeçməz, ələ keçməyən, tutula bilməyən; **~ aroma** hissolunmayan/çox zəif ətir; 3. boyun qaçıran; **~ of the truth** həqiqətdən qaçan/yayınan

**evasively** [ıˈveısıvlı] *adv* qeyri-müəyyən, qeyri-səmimi

**evasiveness** [ıˈveısıvnıs] *n* qeyri-müəyyənlik, qeyri-səmimilik, ikimənalılıq

**Eve** [i:v] *n din.* Yeva, Həvva; qadın; **daughters of ~** Yevanın/Həvvanın qızları, qadınlar

**eve** [i:v] *n* 1. ərəfə; **on the ~** ərəfədə; ...qabağı, ...ərəfəsində; **Christmas ~** milad/xaçaçuran axşamı

**even**[1] [ˈi:vn] *n* 1. cüt ədəd; **~ or odd** tək və ya cüt; 2. tam ədəd

**even**[2] [ˈi:vn] *adj* 1. düz, hamar; **to make ~** hamarlamaq, düzləşdirmək *(üzü, səthi)*; **~ ground** *hərb.* düz yer; 2. sakit, müntəzəm, bərabər; **~ breathing** sakit nəfəs alma; **~ development** bərabər inkişaf; **~ running** sakit/aramla işləmə *(maşın haq.)*; **~ temperature** müntəzəm temperatur; **~ voice** monoton səs; 3. bir, bir cür, eyni, oxşar; **to divide into ~ shares**

bərabər hissələrə bölmək; 4. bir səviyyədə; ~ **with the pavement** səki ilə bir səviyyədə; **to make/to lay ~ with the ground** yerlə bərabərləşdirmək, yerlə yeksan/ darmadağın etmək; 5. müvazinətli; təmkinli, sakit, ağır; ~ **temper** sakit/ağır xasiyyət; 6. ədalətli, haqlı, təmiz, doğru, vicdanlı; ~ **bargain** vicdanlı sövdələşmə; 7. cüt; ~ **number** cüt ədəd; 8. düz; ~ **mile** düz bir mil; ~ **dozen** düz bir düjün

**even³** [ˈi:vn] *v* 1. düzəltmək, hamarlamaq, düz /hamar etmək; **to ~ with the soil** 1) yerlə bərabərləşdirmək; 2) *məc.* yerlə yeksan/darmadağın etmək; 2. bərabərləşdirmək; *Chelsea evened the score just after half-time Çelsi ikinci hissədə hesabı bərabərləşdirdi*

**even⁴** [ˈi:vn] *adv* 1. hətta, əgər; ~ **if** hətta, əgər; *Even if I knew Hətta mən bilsəydim*; ~ **now** hətta indi; *Even so the difficulties would be unsurmountable Hətta belə halda da çətinliklərin öhdəsindən gəlmək mümkün olmayacaqdı*; 2. məhz, lap, tam; *Even as he spoke, it began to rain Məhz o danışan vaxt yağış yağmağa başladı; This is even so Bu məhz belədir*

**evening¹** [ˈi:vnɪŋ] *n* 1. axşam; **in the ~** axşamüstü, axşamçağı; **every ~** hər axşam; **towards ~** axşama doğru/yaxın; **to work ~s** axşamlar işləmək; 2. axşam qonaqlığı, əyləncə gecəsi; axşam; 3. gecə; **to make an ~ of it** gecəni şən keçirmək; **literary ~** ədəbi gecə; **musical ~** musiqi gecəsi;

◊ *Good evening!* 1) *Axşamın/Axşamınız xeyir!* 2) *Sağ ol/olun! Xudahafiz! (axşam ayrılarkən işlədilir)*

**evening²** [ˈi:vnɪŋ] *adj* axşam; gecə; ~ **meal** axşam/şam yeməyi; ~ **party** axşam qonaqlığı; ~ **paper** axşam qəzeti; ~ **classes** axşam kursu; ~ **bazaar/market** axşam bazarı; ~ **dress** gecə tualeti/paltarı, gecə qadın paltarı; **full ~ dress** frak

**evenly** [ˈi:vnlɪ] *adv* 1. bərabər, tənbətən, tənyarı; bir bərabərdə/ölçüdə; 2. hamar, düz; 3. bərabər, bir cür; ~ **divided** bir ölçüdə bölünmüş *(şkala haq.)*; *The two sides are evenly matched Hər iki tərəfin qüvvələri bərabərdir*

**even-minded** [ˈi:vnˈmaɪndɪd] *adj* sakit, təmkinli

**event** [ɪˈvent] *n* 1. hadisə *(mühüm əhəmiyyəti olan)*; **international ~s** beynəlxalq hadisələr; **quite an ~** böyük hadisə; **to follow the course of ~s** hadisələrin inkişafını/gedişini izləmək; **the course of human ~s** bəşəriyyətin inkişaf yolu; **in the natural course of ~s** hadisələrin təbii normal inkişafı zamanı; **the happy ~** xoşbəxt hadisə; **seismic ~** seysmik hadisə, zəlzələ hadisəsi; 2. əgər, işdir; **in the ~ of** əgər, işdir; **in the ~ of his death** əgər o ölsə; **at all ~s** hər halda; **in either ~** həm bu, həm də o halda, hər iki halda; **in any ~** hər hansı halda; **in that ~** o halda, belə olan surətdə, indi ki belədir, bu təqdirdə; 3. tədbir *(qəbul, gecə, tamaşa və s.)*; **social ~** qeyri-rəsmi görüş, dostların görüşü; **formal ~** rəsmi tədbir *(iclas və s.)*; **musical and theatrical ~s** konsertlər və tamaşalar; 4. *id.* yarış; **jumping ~** tullanmaq üzrə yarış; **throwing ~** atma/ tullama üzrə yarış

**eventful** [ɪˈventfl] *adj* 1. hadisələrlə dolu/ zəngin; 2. mühüm nəticələr doğura bilən

**eventual** [ɪˈventʃuəl] *adj* 1. mümkün, mümkün olan/ola bilən, şəraitdən asılı olan; ~ **losses** mümkün olan itkilər; 2. son, sonuncu, axır, axırıncı, qəti; ~ **result** son nəticə; **blunders leading to ~ disaster** nəticədə fəlakətə/bədbəxtliyə səbəb ola biləcək səhvlər

**eventuality** [ɪ.ventʃuˈælɪtɪ] *n* 1. mümkün olan hadisə; mümkünlük, ehtimal; 2. təsadüf, təsadüflük, təsadüfi olma, gözlənilməyən vəziyyət; **to be prepared for all ~ies** bütün təsadüflərə hazır olmaq

**eventually** [ɪˈventʃuəlɪ] *adv* nəticədə, nəhayətdə, ən axırda/sonda; *He will eventually be the gainer by it Nəticədə o bundan ancaq qazanacaq; He will do it eventually Nəhayətdə o bunu edəcək*

**ever** [ˈevəʳ] *adv* 1. bir zaman/vaxt; nə vaxt olursa olsun; **the best film we ~ saw** gördüyümüz filmlər arasında ən yaxşısı; *Have we ever met before? Biz əvvəllər heç görüşmüşük? Hardly /Scarcely ever Demək olar ki, heç vaxt/çox nadir hallarda*; 2. həmişə, daim; həmişəlik, əbədi, ömürlük; *Pedants will ever be carping Pedantlar daim yersiz irad tuturlar; Shakespeare will ever be a great poet Şekspir əbədi olaraq böyük şair kimi qalacaq;* 3. Sual və nida cümlələrində: *Who ever can it be? Bu kim ola bilər?; Who ever would have thought it! Bu kimin ağlına gələ bilərdi?! As if he would ever do such a thing! Elə bil o əvvəllər belə iş görüb; I shall do it as soon as I ever can Mümkün olan kimi mən onu edərəm; Run as fast as ever you can Mümkün qədər sürətlə qaç /qaçın;* 4. heç vaxt, heç bir vaxt; *No man can ever understand you Səni/Sizi heç kəs heç vaxt başa düşə bilməyəcək; I don't think we have ever met Deyəsən, biz heç vaxt görüşməmişik;* 5. çox, lap, lap çox; *This road is ever so much shorter Bu yol lap çox qısadır; He is ever so strong O çox/lap güclüdür; He has ever so many friends Onun lap çoxlu dostları var; I like him ever so much O mənim çox xoşuma gəlir; He is ever such a rich man O çox varlı adamdır*; ~ **after** o vaxtdan bəri; *They married and lived happily ever after Onlar evləndilər və o vaxtdan bəri xoşbəxt yaşadılar;* ~ **since** həmin vaxtdan; *I've known him ever since he was a child Mən onu lap uşaqlıqdan bəri tanıyıram*;

◊ **as good as ~** həmişəki kimi yaxşı; *The argument is as convincing as ever Dəlil həmişəki kimi inandırıcıdır*; **yours ~, ~ yours** həmişə sizə sadiq *(məktubun sonunda imzadan qabaq yazılır)*; **for ~** həmişəlik, əbədi



**everburning** [.evəˈbə:nɪŋ] *adj* sönməyən, sönməz

**ever-frost** [ˈevəfrɔst] *n* daimi donuşluq

**ever-frozen** [.evəˈfrouzn] *adj* daimi donmuş *(torpaq haq.)*

**evergreen¹** [ˈevəgri:n] *n* həmişəyaşıl ağac/ kol

**evergreen²** [ˈevəgri:n] *adj* həmişəyaşıl; ~ **valley** həmişəyaşıl dərə

**evergrowing** [.evəˈgroɪŋ] *adj* həmişə artan/ böyüyən

**everlasting¹** [.evəˈla:stɪŋ] *n* 1. əbədilik, daimilik; **from ~** qədimdən, əzəldən, qədimdən bəri; **from ~ to ~** həmişə, daim; 2. *din.* **the Everlasting** əbədi, əzəli *(ilahiyyatda allaha verilən sifətlərdən biri)*, allah; 3. *bot.* solmaz çiçək

**everlasting²** [.evəˈla:stɪŋ] *adj* 1. həmişəlik, əbədi, daimi, ömürlük, ölməz; **the ~ bonfire** *(Shakespeare)* əbədi od *(cəhənnəmdə)*; ~ **fame** əbədi şöhrət; 2. bezikdirici, aramsız, ara verməyən; ~ **headaches** aramsız başağrıları; **this ~ noise** bu aramsız səs; *I'm tired of his everlasting complaints Mən onun aramsız şikayətlərindən yorulmuşam/təngə gəlmişəm*

**everlastingly** [.evəˈla:stɪŋlɪ] *adv* həmişə, həmişəlik, əbədi, ömürlük, əbədi olaraq

**ever-living** [.evəˈlɪvɪŋ] *adj* ölməz, əbədi, həmişə sağ; tükənməz; ~ **source** tükənməz mənbə

**ever-present** [.evəˈpreznt] *adj* 1. hər yerdə mövcud olan; 2. *məc.* harada aş, orada baş

**evert** [ɪˈvə:t] *v* çevirmək, tərs üzünə çevirmək

**every** [ˈevrɪ] *adj* 1. hər, hər bir; ~ **word** hər bir söz; *I am expecting him every minute Mən onu hər dəqiqə gözləyirəm; Not every man could do it Bunu hər adam edə bilməzdi; Every pupil in the class passed the examination Sinifdə olan hər bir şagird imtahanı verdi;* **once in ~ week** həftədə bir dəfə; *Every face was smiling Hər üzdə təbəssüm var idi*; 2. hər cür/növ, müxtəlif, cürbəcür; *We have every confidence in him Biz ona tam inanırıq; There is every reason to believe that this is true Bunun düz olmasına inanmaq üçün hər cür əsas var*; 3. birləşmələrdə: ~ **one** hamı, istisnasız olaraq; bütün; *Every one of his friends has left him Bütün dostları onu tərk ediblər; Every one of us was there Biz hamımız orada idik*; ~ **other** hər ikinci adam; ~ **other day** günaşırı; ~ **other minute** bir dəqiqədən bir; hər dəqiqə, arası kəsilmədən;

◊ ~ **time** hər dəfə; ~ **time he comes** hər dəfə o gələndə; **in ~ way** hər cəhətdən; ~ **now and then/again** hərdənbir, bəzən

**everybody** [ˈevrɪbɔdɪ] *pron* hamı, hər, hər bir kəs; *Not everybody can understand it Hər kəs bunu başa düşə bilməz; Everybody knows this Hamı bunu bilir; Everybody who comes here admires the scenery Buraya gələn hər kəs bu mənzərəyə valeh olur; Everybody will be there Hamı orada olacaq*

**everyday** [ˈevrɪdeɪ] *adj* 1. gündəlik, hərgünkü, hərgünlük, hər gün olan; ~ **affairs** gündəlik işlər; ~ **occurrence** gündəlik/ adi hadisə; ~ **garments** gündəlik paltar; 2. adi; *He is no everyday writer O, adi yazıçı deyil*

**everyhow** [ˈevrɪhau] *adv* 1. hər cəhətdən; 2. hər vasitə ilə

**everyman** [ˈevrɪmæn] *n* adi/hər adam, hər kəs/kim; **Everyman's Library** hamı üçün kitabxana

**everyone** [ˈevrɪwʌn] *pron* = **everybody**

**ever-young** [.evəˈjʌŋ] *adj* qocalmayan, həmişəcavan; solmayan, solmaz

**everyplace** [ˈevrɪpleɪs] *adv amer d.d.* hər yerdə/yanda/tərəfdə; *I looked everyplace Mən hər yerə baxdım*

**everything** [ˈevrɪθɪŋ] *pron* 1. hər şey; *He thinks he knows everything O fikirləşir ki, o hər şeyi bilir*; ~ **for sports** hər şey idman üçün *(lövhə)*; 2. *d.d.* əhəmiyyətli olan hər şey, ən mühüm; *Money is everything to him Pul onun üçün hər şeydir*

◊ *Everything is good in its season at. söz. Hər şey vaxtında yaxşıdır. Hər şeyin öz vaxtı var; To know everything is to know nothing at. söz. Hər şeyi bilmək, heç nəyi bilməmək deməkdir*

**everyway** [ˈevrɪweɪ] *adv* 1. hər cəhətdən, hər vasitə ilə, cürbəcür yollarla; *You wrong me everyway (Shakespeare) Sən/ Siz hər cəhətdən mənə qarşı ədalətsizsən /ədalətsizsiniz*; 2. bütün istiqamətlərdə

**everywhere** [ˈevrɪweəʳ] *adv* hər yerdə/tərəfdə/yanda; *You'll find kind men everywhere Sən/Siz hər yanda mərhəmətli/ xeyirxah adamlar taparsan/taparsınız*

**evict** [ɪˈvɪkt] *v hüq.* 1. çıxartmaq *(xüs. icarədarı)*; *The tenants were evicted for non-payment of rent Kirayənişinlər mənzil haqqını ödəmədiklərinə görə evdən çıxarıldı*; 2. məhkəmə vasitəsilə almaq, məhkəmədə işi udmaq

**eviction** [ɪˈvɪkʃn] *n hüq.* 1. köçürtmə, köçürdülmə; 2. məhkəmə tərəfindən məhrum edilmə *(əmlakdan)*; məhkəmə vasitəsilə geri alma *(əmlakı icarədardan)*

**evidence¹** [ˈevɪdns] *n* 1. tapıntı; əsas; fakt, əlamət, nişanə; **archaelogical ~** arxeoloji tapıntı; **historical ~** tarixi fakt; *There is some evidence of recovery Yaxşılaşmağın bəzi əlaməti var*; 2. sübut, dəlil; **to bear/to give ~ of** sübut etmək /göstərmək, təsdiq etmək; *Let's have an evidence of good faith Bizə sənin/sizin vicdanlı olduğunu/olduğunuzu göstərən sübut lazımdır*; 3. aydınlıq, aşkarlıq, açıqlıq, şübhəsizlik; **in ~** hazırda/mövcud olan, iştirak edən; görünən, gözə çarpan; *He was not in evidence O heç bir yanda*

*gözə dəymirdi*; **to be very much in ~** yayılmaq, adi hadisə olmaq; daim nəzərdə olmaq; 4. *hüq.* sübut, dəlil; **circumstantial/ indirect ~** dolayı sübut; **documentary ~** yazılı sübut; **oral and written ~** şifahi və yazılı sübut; **to call in ~** şahid sifətilə çağırmaq; **to give ~** şahid ifadəsi vermək; **to take the ~ of** ***smb.*** bir kəsi dindirmək/ istintaq etmək və protokol yazmaq;
◊ **X-ray ~** rentgen vasitəsilə müayinə etmə, rentgenoqram *(rentgen şüaları vasitəsilə foto-qraf lövhəsində alınmış şəkil)*

**evidence[2]** [ˈevɪdns] *v* 1. şahidlik etmək; ifadə vermək; təsdiq etmək; **to ~ *one's* appreciation** razılığını göstərmək, bəyənməsini təsdiq etmək; 2. təsdiq etmək, doğru olduğunu sübut etmək; **documents evidencing shipment** gəmiyə yükləməni /gəmi ilə göndərməni təsdiq edən sənədlər; 3. sübut etmək

**evident** [ˈevɪdənt] *adj* aydın, aşkar, bəlli, şübhəsiz, göz qabağında olan, açıq, açıqdan-açığa; *It's evident Aydındır, Görünür; It must be evident to all of you that... Sizin hamınıza aydın olmalıdır ki..*

**evidently** [ˈevɪdəntlɪ] *adv* görünür/yəqin ki, ehtimal/olsun ki, şübhəsiz

**evil[1]** [ˈi:vl] *n* 1. pislik, yamanlıq, pis iş, şər; **good and ~** yaxşılıq və yamanlıq, xeyir və şər; **to believe ~ of others** başqaları haqqında pis fikirləşmək; **to speak ~** dalca danışmaq, qeybət etmək, yamanlamaq, pisləmək; *Evil comes from evil Pislik pislik doğurar/gətirər*; **to return good for ~** pisliyin əvəzini yaxşılıqla vermək; 2. qüsur, nöqsan, əskiklik, eyib; əxlaqsızlıq; **to lead a life of ~** əxlaqsız həyat sürmək; **to correct the ~s of the system** sistemin qüsurlarını aradan qaldırmaq; 3. fəlakət, bəla, bədbəxtlik; uğursuzluq; 4. *din.* günah, təqsir, suç, qüsur; qəbahət, eyib, eyib iş; **to shun ~** eyib/günah işdən əl çəkmək/ uzaq olmaq

**evil[2]** [ˈi:vl] *adj* 1. acıqlı, hirsli; kinli, qəzəbli, çox pis, qəlbiqara, mərdimazar, pisfikirli, pisniyyətli, qərəzli; **the Evil One** Cin, Şeytan; *Deliver us from the Evil One din. Bizi məkrdən /şərdən qoru*; **~ spirits** cinlər, şeytanlar; **~ tongue** dedi-qoduçu, xəbərçi, sözgəzdirən, böhtançı; 2. yava, tərbiyəsiz, qüsurlu, nöqsanlı, eyibli; pis; **~ conscience** ləkəli vicdan; 3. əxlaqsız, əxlaqı pozuq/pozğun, günahkar, təqsirli; cinayətkar; **~ deeds** cinayətlər; **~ life** əxlaqsız /pozğun həyat; **~ men** *din.* günahkarlar; 4. *d.d.* çox pis, çirkin, iyrənc, mənfur; **~ dinner /weather** çox pis nahar /hava; **~ slander** iyrənc böhtan; **~ temper** dözülməz xarakter; **the ~ day** qara gün;
◊ **the ~ eye** bədnəzər, dəyməcəli göz

**evil-doer** [ˈi:vlˈduər] *n* 1. cani, cinayətkar; yaramaz; 2. günahkar, qüsurlu; suçlu *(adam)*

**evil-doing** [ˈi:vlduɪŋ] *n* pis hərəkət/rəftar/ əməl; zərərli fəaliyyət

**evil-minded** [ˈi:vlˈmaɪndɪd] *adj* acıqlı, hirsli, qəzəbli; bədxah, qərəzkar

**evil-smelling** [ˈi:vlˈsmelɪŋ] *adj* üfunətli, pis iy verən

**evil-speaking** [ˈi:vlˈspi:kɪŋ] *n* dalınca danışma, qeybət, qeybət etmə, başqasını pisləmə

**evoke** [ɪˈvouk] *v* 1. səbəb/bais olmaq, törətmək, oyatmaq, doğurmaq, yada salmaq; **to ~ admiration** heyranlıq/məftunluq doğurmaq; **to ~ surprise** təəccüb doğurmaq /oyatmaq; **to ~ memories of the past** keçmişin xatirələrini yada salmaq; 2. çağırmaq *(cini, şeytanı)*

**evolution** [ˌi:vəˈlu:ʃn] *n* 1. inkişaf, dəyişmə, inkişaf/böyümə prosesi; **the ~ of the child/of the drama/of a language** uşağın/dramaturgiyanın/dilin inkişafı; 2. təkamül, tədrici inkişaf; **Theory of Evolution** Təkamül nəzəriyyəsi, darvinizm; 3. inkişaf, genişləndirmə *(fikri, süjeti və s.)*; **the ~ of the ages** əsrlərin inkişafı

**evolutionary** [ˌi:vəˈlu:ʃnərɪ] *adj* təkamülə/inkişafa aid olan; **~ changes/processes** təkamül dəyişiklikləri/prosesi

**evolve** [ɪˈvɔlv] *v* 1. inkişaf etdirmək, genişləndirmək; **to ~ the powers of (the) mind** əqli bacarığı inkişaf etdirmək; **to ~ a scheme** planı genişləndirmək; **to ~ a theory** nəzəriyyəni inkişaf etdirmək; 2. inkişaf/təkamül etmək, tədricən inkişaf etmək; *Society evolved through the ages Cəmiyyət əsrlər boyunca inkişaf edib*; 3. **(into)** çevrilmək; **to ~ into a human being** insana çevrilmək; 4. açmaq, üzə çıxartmaq; **to ~ a secret** sirri açmaq; **to ~ new talents** yeni istedadları üzə çıxartmaq

**evolvement** [ɪˈvɔlvmənt] *n* inkişaf, təkamül, tədrici inkişaf

**ex[1]** [eks] *n* I eks, X *hərfinin adı*

**ex** [eks] *n* II *(pl* **exes** *və ya* **ex's)** *d.d.* keçmiş arvad /ər

**ex[2]** [eks] *pref Rütbə/Vəzifə bildirən sözlərin əvvəlində işlənir və "keçmiş, sabiq" mənasını ifadə edir*: **ex-champion** keçmiş/sabiq çempion; **ex-president** keçmiş/ sabiq prezident; **ex-prime-minister** sabiq /keçmiş baş nazir; **ex-wife** keçmiş arvad; **ex-husband** keçmiş ər

**exact[1]** [ɪgˈzækt] *adj* 1. dəqiq, doğru, düzgün, dürüst; **~ meaning/time/size/figure** dəqiq məna/ vaxt/ ölçü/rəqəm; **~ directions** dəqiq/dürüst göstərişlər; **~ translation** dürüst/dəqiq tərcümə; 2. səliqəli, diqqətli; **to be ~ in *one's* payments** səliqəli ödəmək; *He is exact in business O, işdə dəqiqdir/səliqəlidir*; 3. möhkəm; **~ discipline** möhkəm intizam;
◊ **~ sciences** dəqiq elmlər

**exact[2]** [ɪgˈzækt] *v* 1. nail olmaq, tələb etmək; **to ~ promises** vədlərə nail olmaq; **to ~ concessions** güzəştlərə nail olmaq; **to ~ obedience /respect from everybody** ümumi itaətə/hörmətə nail olmaq; **to ~ compliance** razılığa nail olmaq; **to ~ an account from *smb.*** bir kəsdən hesabat tələb etmək; *Their grey hairs exact of us a particular respect Onların ağ saçları bizdən xüsusi hörmət tələb edir*; 2. layiq olmaq; **work that ~s very careful attention** xüsusi diqqətəlayiq iş; 3. almaq; **to ~ payment** çatası məbləği almaq; 4. *hüq.* zorla almaq, qoparmaq *(vergi və s.-ni həddən artıq adət. qeyri-qanuni)*; almaq *(rüşvət)*; 5. *hüq.* məhkəməyə çağırmaq





**exactly** [ɪgˈzæktlɪ] *adv* 1. dəqiq, düz, dümdüz, dürüst; *I don't know exactly what happened Nə baş verdiyini mən dəqiq/ dürüst bilmirəm*; 2. tam, lap, elə özüdür ki var; **~ the man for the post** bü vəzifəyə tam yararlı adam; 3. *d.d.* əsla; qətiyyən; *Not exactly Qətiyyən belə deyil; He is not exactly a scholar O, qətiyyən əsla/alim deyil*

**exactness** [ɪgˈzæktnɪs] *n* 1. dəqiqlik, dürüstlük, düzgünlük; 2. diqqət, səliqə, mükəmməllik

**exactor** [ɪgˈzæktər] *n* 1. tərifsevən adamlar; 2. hədə ilə başqasından pul alan/qoparan adam; qeyri-qanuni mükafat alan məmur, rüşvətxor; 3. *arx.* vergi toplayan

**exaggerate** [ɪgˈzædʒəreɪt] *v* 1. şişirtmək; mübaliğə etmək; **to ~ difficulties** çətinlikləri şişirtmək; 2. artırmaq, çoxaltmaq, böyütmək, genəltmək; **to ~ in scale** miqyası böyütmək/artırmaq

**exaggerated** [ɪgˈzædʒəreɪtɪd] *adj* 1. artırılmış, böyüdülmüş, şişirdilmiş, mübaliğə edilmiş; 2. *tib.* qeyri-normal bir surətdə genişlənmiş, böyümüş *(ürək və s. haq.)*

**exaggeration** [ɪgˌzædʒəˈreɪʃn] *n* artırma; böyütmə, şişirtmə, mübaliğə etmə; *He told the story as it happened and without exaggeration O, əhvalatı şişirtmədən necə baş vermişdisə elə də danışdı*

**exalt** [ɪgˈzɔ:lt] *v* 1. yüksəltmək, qaldırmaq, ucaltmaq; həddən artıq şişirtmək, göylərə qaldırmaq; yüksək rütbəyə qaldırmaq; taxta oturtmaq; 2. həddən artıq tərifləmək; **to ~ to the skies** tərifini göylərə qaldırmaq; 3. gücləndirmək *(təsiri və s.)*; şişirtmək, mübaliğə etmək; 4. oyatmaq *(təsəvvür)*; 5. bir kəsi heyran etmək/cuşa gətirmək; 6. *arx.* qaldırmaq; **to ~ *one's* voice** səsini qaldırmaq

**exaltation** [ˌegzɔ:lˈteɪʃn] *n* 1. yüksəldilmə, yüksəlmə, qalxma, ucalma; tərifləmə, təriflənmə; yüksək rütbəyə qaldırma, taxta oturtma; 2. hədsiz həyəcan, vəcd; cuşa gəlmə; ehtiras

**exalted** [ɪgˈzɔ:ltɪd] *adj* 1. yüksək *(hiss və s. haq.)*; 2. nəcib, alicənab; əzəmətli, möhtəşəm; heybətli, böyük; 3. yüksək *(mövqe, vəzifə, rütbə haq.)*; **his ~ position** onun yüksək vəzifəsi/rütbəsi; 3. həyəcanlanmış, cuşa gəlmiş, həyəcanlı, coşğun, qızğın

**examination** [ɪgˌzæmɪˈneɪʃn] *n* 1. yoxlama, müayinə, baxma, baxılma, təftiş; **to make an ~** baxmaq, yoxlamaq, müayinə etmək; **~ of equipment** texniki baxış; **~ by touch** *tib.* əl ilə yoxlama *(xəstəni)*; **customs ~** gömrükxana nəzarəti; **post-mortem ~** basdırılandan sonra çıxarıb müayinə etmə *(meyiti)*; 2. araşdırma, araşdırılma, öyrənilmə, öyrənmə, kəşfiyyat, tədqiq etmə/edilmə; **thorough ~** hərtərəfli öyrənmə *(materialı)*; **geological ~** geoloji kəşfiyyat; 3. imtahan; **to give an ~** imtahan etmək, yoxlamaq; **to go in for/to sit for/to take an ~** imtahan vermək; **to pass an ~** imtahandan çıxmaq; **to fail in an ~** imtahanda pis qiymət almaq, imtahandan kəsilmək; 4. sınama; baxma, gözdən keçirmə, müzakirəyə qoyma/qoyulma; ekspertiza *(bir qərara gəlmək üçün hər hansı bir məsələnin mütəxəssislər tərəfindən öyrənilməsi)*; **on/upon ~** yoxlama zamanı; **~ of a claim** iddiaya baxma; 5. *hüq.* istintaq; 6. *hüq.* şahidin/ müttəhimin dindirilməsi; **to take the ~ of *smb.*** bir kəsi istintaq etmək və cavabları protokola yazmaq

**examination-paper** [ɪgˌzæmɪˈneɪʃnˌpeɪpər] *n* 1. sorğu vərəqəsi/anketi; 2. imtahan bileti

**examine** [ɪgˈzæmɪn] *v* 1. baxmaq, gözdən keçirmək; müzakirə etmək; 2. yoxlamaq, təftiş/tədqiq etmək; nəzərdən keçirmək; **to ~ accounts/facts** pul sənədlərini/faktları yoxlamaq; **to ~ a question** sualı nəzərdən keçirmək; **to ~ documents** sənədləri nəzərdən keçirmək; *He was closely examining the picture O, şəkli yaxından nəzərdən keçirirdi*; 3. dindirmək, istintaq etmək *(əsiri, müttəhimi, şahidi)*; **to ~ a witness** şahidi dindirmək; 4. *tib.* qulaq asmaq, müayinə etmək

**examinee** [ɪgˌzæmɪˈni:] *n* imtahan verən; imtahan götürən; müayinə edən, yoxlayan

**examiner** [ɪgˈzæmɪnər] *n* 1. imtahan götürən/edən, imtahançı; **to satisfy the ~s** imtahançıları qane etmək; 2. yoxlayan, müayinə edən, müayinəçi; nəzarətçi; tədqiqatçı; 3. ekspert *(bir məsələ haqqında qəti fikir söyləyən mütəxəssis)*

**example** [ɪgˈza:mpl] *n* 1. misal, nümunə, örnək; **for ~** məsələn, misal üçün; **to give /to set an ~** nümunə/örnək olmaq; **to follow the ~ of *smb.*** bir kəsdən nümunə götürmək; **to learn by ~** nümunədən öyrənmək; **an ~ of a writer's work** yazıçı yaradıcılığının nümunəsi; **~s of the great masters** böyük sənətkar əsərlərinin nümunələri; 2. nüsxə; **an ~ of a rare book** nadir kitabın nüsxəsi; 3. nümunəvi cəza/ dərs; xəbərdarlıq; **to make an ~ of an offender** başqalarına dərs olsun deyə cinayətkarı cəzalandırmaq; *Let this be an example to you Qoy bu sənə/sizə dərs olsun*; 4. oxşar hadisə; **beyond ~** misilsiz /tayı-bərabəri olmayan; **without ~** misilsiz, görünməmiş, tayı-bərabəri olmayan,

misli görünməmiş; **generosity without** ~ görünməmiş səxavət/əliaçıqlıq

**exasperate** [ɪg'za:spreɪt] *v* **1.** acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək, özündən çıxartmaq; *The teacher was exasperated at the stupidity of the pupil Şagirdin kütlüyü müəllimi əsəbiləşdirdi/özündən çıxartdı*; **2.** hiddətə/qəzəbə səbəb olmaq; qəzəbləndirmək, qeyzləndirmək, hiddətləndirmək

**exasperated** [ɪg'za:spreɪtɪd] *adj* acıqlı, hirsli, özündən çıxardılmış, hirsləndirilmiş

**exasperating** [ɪg'za:spreɪtɪŋ] *adj* əsəbiləşdirici, əsəbiləşdirən; dözülməz, çox pis

**exasperation** [ɪg.za:spə'reɪʃn] *n* **1.** acıq, hirs; **2.** qeyz, qəzəb; kin, ədavət; **3.** ağırlaşma *(xəstəlik, ağrı və s. haq.)*

**excavate** ['ekskəveɪt] *v* **1.** qazımaq; **to ~ a cellar** anbar/zirzəmi qazımaq; **to ~ a tunnel** tunel qazımaq; **2.** qazıb/eşib çıxartmaq; qazıb tapmaq; **3.** *məc.* tapmaq; **to ~ a buried treasure** basdırılmış xəzinəni tapmaq; **4.** torpaq çıxartmaq; torpaq işləri görmək/aparmaq; **5.** *geol.* qazıntı işləri aparmaq

**excavation** [.ekskə'veɪʃn] *n* **1.** qazıma, belləmə, qazıntı; qazıb çıxartma; qazıb tapma; **2.** qazılmış quyu, özül yeri; oyuq, çuxur, qazıq, qazıntı işləri; **3.** *geol.* qazıntı

**excavator** ['ekskəveɪtə'] *n* **1.** yerqazan fəhlə, qazmaçı; **2.** *tex.* ekskavator; yerqazan maşın; **walking ~** addımlayan ekskavator

**exceed** [ɪk'si:d] *v* **1.** ötmək, keçmək, çox/ artıq olmaq; *The task exceeds his ability Bu məsələyə/tapşırığa onun gücü çatmaz*; **2.** ötüb keçmək, üstün gəlmək, ötmək, geridə buraxmaq; **to ~ in strength** gücdə üstün olmaq/gəlmək; *The success exceeded our expectations Müvəffəqiyyət gözlədiyimizdən artıq oldu*; **3.** pozmaq, riayət/əməl etməmək; ...kənara/cızığından çıxmaq, həddini aşmaq; **to ~ authority** səlahiyyətindən kənara çıxmaq; **to ~ instructions** göstərişləri pozmaq; **4.** vaxtını keçirmək /ötürmək; **to ~ *one's* leave** məzuniyyətin vaxtını ötürmək

**exceeding**[1] [ɪk'si:dɪŋ] *n* **1.** ötmə, keçmə, ötüb keçmə, aşma; həddini aşma; **2.** vaxtını keçirtmə /ötürmə; **~ of leave** *hərb.* məzuniyyətin vaxtını ötürmə

**exceeding**[2] [ɪk'si:dɪŋ] *adj* hədsiz, həddən artıq, son dərəcə güclü; çox böyük/iri; **the ~ disorder of the room** otaqda çox böyük/həddən artıq səliqəsizlik

**exceedingly** [ɪk'si:dɪŋlɪ] *adv* fövqəladə, olduqca, son/müstəsna dərəcədə, çox, həddən artıq; **an ~ difficult problem** həddən artıq çətin problem

**excel** [ɪk'sel] *v* **1.** ötüb keçmək, üstün gəlmək, geridə buraxmaq; **to ~ *one's* friends in courage** dostlarını cəsarətdə ötüb keçmək; **to ~ *one's* teacher** öz müəllimini ötüb keçmək; **2. (in, at)** seçilmək, fərqlənmək *(yaxşı mənada)*; ayrılmaq; **to ~ at games** idman oyunlarında seçilmək/fərqlənmək

**excellence** ['eksləns] *n* **1.** mükəmməllik, kamillik; kamil ustalıq/sənətkarlıq; **the ~ of rendition** yüksək ifaçılıq məharəti; **the ~ of workmanship** çox gözəl iş/ ustalıq; **2.** üstünlük, imtiyaz; **distinctive ~** şəksiz üstünlük

**excellency** ['ekslənsɪ] *n:* **1. Excellency** zati-ali; **Your Excellencies** Zati-aliləri; **2.** *arx.* üstünlük, mühüm keyfiyyət

**excellent** ['ekslənt] *adj* **1.** çox gözəl/yaxşı/qəşəng; əla; **~ song/idea** çox gözəl mahnı /fikir; **~ dinner** əla nahar; **~ man** çox yaxşı adam; **2.** *arx.* hamıdan üstün olan, misilsiz/tayı-bərabəri olmayan, ən mükəmməl; **~ hypocrite** tayı-bərabəri olmayan ikiüzlü/riyakar; **~ liar** qatı yalançı; **3.** uca, yüksək, hündür, yüksək vəzifəli/ mövqe tutan; çox hörmətli, əziz

**except**[1] [ɪk'sept] *v* **1.** istisna etmək; *Nobody excepted Heç kim istisna edilmir*; *He was excepted from the general pardon O, ümumi amnistiyaya düşmədi*; **2.** protest/ qəti etiraz etmək; *I except against his statement Mən onun bəyanatına qəti etiraz edirəm*

**except**[2] [ɪk'sept] *prep* müstəsna olaraq, çıxmaqla, ...başqa, ...qeyri, ...savayı; *Everyone is ready except me Məndən başqa hamı hazırdır; I take no orders except from my commander Öz komandirimdən başqa heç kəsin əmrini qəbul etmirəm*

**exception** [ɪk'sepʃn] *n* **1.** istisna; başqa; **an ~ from the rule** qaydadan istisna; **by way of ~** istisna etməklə; **with the ~ of *smb./*of *smth.*** bir kəs /şey istisna olmaqla; **without ~** istisnasız olaraq; **to make an ~** istisna etmək; **2.** etiraz; **to take ~ to *smth.*** bir şeyə qarşı etiraz etmək; **to bring in an ~ against** namizədə qarşı etiraz etmək; əleyhinə çıxış etmək; **to be beyond ~** heç bir etiraza/şikayətə səbəb olmamaq; **3.** bəyənməmə, mənfi qiymət, pisləmə; danlaq, məzəmmət, tənə, narazılıq; **to take ~ at *smth.*** bir şeydən incimək/ narazılıq etmək

**exceptionable** [ɪk'sepʃnəbl] *adj* eyibli, pis, qəbahətli, nəzakətsiz, nöqsanlı, etiraza səbəb olan; **~ conduct** çirkin hərəkət/ davranış; **~ remark** kobud/nəzakətsiz irad; *There was nothing exceptionable in his comment Onun dediklərində/sözlərində təhqiredici heç nə yox idi*

**exceptional** [ɪk'sepʃənl] *adj* müstəsna, xüsusi, qeyri-adi, qəribə; **~ opportunity** qeyri-adi /müstəsna imkan; **an ~ use of a word** sözün qeyri-adi işlənməsi

**excess** [ɪk'ses] *n* **1.** çoxluq, bolluq; artıq, qalıq; **~ of provisions** ərzaqın/azuqənin bolluğu; **~ of caution** lüzumsuz ehtiyat; **to dispose ~es** artığı /qalığı satmaq/satıb pula çevirmək; **in ~ of** daha çox, normadan artıq; **production in ~ of plan** plandan artıq istehsal; **2.** artıq, əlavə; *Last year there was an excess of imports over exports Keçən il idxal ixracdan artıq oldu*; **3.** ifratçılıq, hədsizlik, həddindən artıqlıq; **to ~** həddindən artıq, son dərəcə /lazım olduğundan çox; **to drink to ~** həddindən artıq yemək, sərxoşluq/əyyaşlıq etmək; *She was serious almost to excess O həddindən artıq ciddi idi*; **to control ~es** ifratçılığa yol verməmək; **to denounce ~es** ifratçılığı pisləmək; **~ of jurisdiction on the part of the House** Palatanın öz səlahiyyətlərini aşması; **4.** nəfsini saxlamama, özünü gözləməmə, hədd-hüdud bilməmə *(yeməkdə, içməkdə və s.)*; **5.** *riyaz.* qalıq; artıq; **~ of nine** doqquzun qalığı *(böləndə)*; **~ baggage** normadan artıq baqaj/yük; **~ energy** enerji artığı; **~ acid** *tib.* turşuluq dərəcəsinin artıqlığı

**excessive** [ɪk'sesɪv] *adj* hədsiz, həddən artıq; *The price is excessive Qiymət həddən artıq yüksəkdir*; **~ praise** hədsiz/həddən artıq tərif

**exchange**[1] [ɪks'tʃeɪndʒ] *n* **1.** dəyişmə, dəyişdirmə, mübadilə; **in ~ for** yerinə, əvəzinə; **to give/to offer/to take in ~** əvəzinə vermək/təklif etmək /götürmək; **to make an ~** mübadilə etmək, dəyişmək, dəyişdirmək; **~ of goods** əmtəə mübadiləsi, mal dəyişmə; **~ of views** fikir mübadiləsi; **cultural ~s** mədəniyyət mübadilələri; **~ of prisoners** *hərb.* hərbi əsirlərin dəyişdirilməsi; **2.** *mal.* xırdalama/xırdalanma *(pul)*; **3.** dəyişmə, əvəz etmə/alma; **the ~ of tears for smiles** göz yaşlarının təbəssümlərlə əvəz olunması; **4.** xarici valyuta *(həmçinin* **foreign** *~)*; məzənnə *(xarici valyuta haq.)*; *Exchange is falling/rising/ steady Məzənnə düşür/qalxır/sabitdir*; **~ of the day** günün məzənnəsi; **5.** birja; **commodity/goods ~** mal /əmtəə birjası; **corn/grain ~** taxıl birjası; **stock ~** fond birjası; **rules of the ~** birja qaydaları/qanunları; **labour ~** əmək birjası; **6.** mərkəzi telefon stansiyası; kommutator

**exchange**[2] [ɪks'tʃeɪndʒ] *v* **1.** dəyişmək, dəyişdirmək, mübadilə etmək; **to ~ farm products for manufactured goods** kənd təsərrüfatı məhsullarını sənaye mallarına dəyişdirmək; **to ~ a book** kitabı dəyişdirmək *(kitabxanada)*; **to ~ opinions** fikir mübadiləsi etmək; **to ~ seats** yerləri dəyişmək; **to ~ prisoners** hərbi əsirləri dəyişdirmək; **to ~ greetings** bir-birilə salamlaşmaq; **2.** xırdalamaq *(pulu)*; dəyişdirmək *(bir valyutanı digərinə)*

**exchangeable** [ɪks'tʃeɪndʒəbl] *adj* **1.** dəyişdirilməli; **~ within five days** beş gün ərzində dəyişdirilə bilən; **not ~** dəyişdirilə bilməyən; **2.** dəyişdirmək üçün yararlı; **3.** *tex.* bir-birini əvəz edə bilən

**exchequer** [ɪks'tʃekə'] *n* xəzinə; dövlət xəzinəsi; **Exchequer** maliyyə nazirliyi *(İngiltərədə)*; **Chancellor of the Exchequer** xəzinə kansleri *(İngiltərədə maliyyə naziri)*



**Exchequer-chamber** [ɪks'tʃekətʃeɪmbə'] *n tar.* **1.** xəzinə palatası; **2.** apellyasiya məhkəməsi

**excise**[1] [ek'saɪz] *n* **1.** aksiz, aksiz vergisi *(həm də* **~ duty***)*; **the ~ on beer/tobacco** pivəyə/tütünə aksiz vergisi qoyma; **to levy ~** aksiz vergisi qoymaq; **2.** lisenziya *(1) xaricə mal aparmaq və ya xaricdən mal gətirmək üçün icazə; 2) həmin icazəni təsdiq edən sənəd)*

**excise**[2] [ek'saɪz] *v* **1.** aksiz vergisi almaq/ qoymaq; **2.** *d.d.* həddən artıq dəyər almaq /tələb etmək; **3.** *tib.* kəsmək, kəsib çıxartmaq/ayırmaq; **to ~ tumour** şişi kəsib çıxartmaq; **4.** çıxartmaq *(mətndən və s.)*; **to ~ a reference** sitatı çıxartmaq *(mətndən)*

**excite** [ɪk'saɪt] *v* **1.** həyəcanlandırmaq, qızışdırmaq, həyəcana gətirmək/salmaq, əsəbiləşdirmək, təşvişə salmaq, narahat etmək; *The news excited them Xəbər onları həyəcanlandırdı; Don't excite yourself Həyəcanlanma!/Həyəcanlanmayın!*; **to ~ passions/emnity** ehtirasları /ədavəti qızışdırmaq; **2.** oyatmaq, oyandırmaq; törətmək, doğurmaq, qaldırmaq; **to ~ interest** maraq oyatmaq; **to ~ envy/ jealousy** paxıllıq /qısqanclıq oyatmaq; **to ~ a rebellion** üsyan qaldırmaq

**excited** [ɪk'saɪtɪd] *adj* həyəcanlı, əsəbi, qızğın, coşğun; **~ children** həyəcanlı uşaqlar

**excitedly** [ɪk'saɪtɪdlɪ] *adv* həyəcanla, təşvişlə, narahatlıqla, həyəcanlı, həyəcan içində, əsəbi, əsəbi halda

**excitement** [ɪk'saɪtmənt] *n* **1.** həyəcan, təşviş, iztirab, narahatlıq, əndişə

**exciting** [ɪk'saɪtɪŋ] *adj* **1.** oyadıcı, hərəkətə gətirən, həyəcanlandıran, narahat edən, təşvişə salan, əsəbiləşdirən, maraq doğuran *(hekayə, xəbərlər və s. haq.)*; *How exciting! d.d. Necə də maraqlıdır*; **2.** *tib.* səbəb; **~ cause** xəstəliyin bilavasitə səbəbi

**exclaim** [ɪks'kleɪm] *v* **1.** ucadan/bərkdən demək; qışqırmaq *(ağrıdan, təəccübdən, əsəbdən)*; haraylamaq, səsləmək; **2.** *din.* çağırmaq, bağırmaq, fəryad etmək; **3. against, at)** etiraz səsini qaldırmaq; narazılıq/şikayət etmək

**exclamation** [.ekskla'meɪʃn] *n* **1.** çağırma, qışqırma, haraylama, səsləmə; **mark/ note /point of ~** nida işarəsi; **2.** narazılıq, şikayət, qəti etiraz, protest

**exclude** [ɪks'klu:d] *v* **1.** çıxartmaq, xaric etmək, qovmaq, buraxmamaq, içəri buraxmamaq; **to ~ from a club** klubun üzvlüyündən çıxartmaq/xaric etmək; **to ~ from certain privileges** müəyyən imtiyazlardan/güzəştlərdən məhrum etmək; **to ~ the light** işığın keçməsinə yol verməmək; **to ~ a new war** yeni müharibəyə yol verməmək; **2.** götürmək, aradan qaldırmaq, kənar /xaric etmək, çıxartmaq; **to ~ from consideration** müzakirədən çıxartmaq; **3.** *hüq.* **to ~ evidence** sübut kimi qəbul etməmək; **4.** qovmaq; **to ~ from a country** ölkədən qovmaq

**exclusion** [ɪks'klu:ʒn] *n* 1. buraxmama, yol /icazə verməmə, çıxarma, kənar etmə; 2. qovma, sürgün etmə

**exclusive** [ɪks'klu:sɪv] *adj* 1. müstəsna, xüsusi, qeyri-adi; ~ **privileges** xüsusi/müstəsna imtiyazlar; ~ **right** müstəsna hüquq; 2. bir araya sığışmaz/sığışa bilməyən, uyuşmaz, ziddiyyətli; **mutually** ~ bir-birini inkar edən, bir araya sığmayan; 3. qapalı, əlçatmaz, əldə edilməz; ~ **caste-system** qapalı kasta sistemi; ~ **school** qapalı məktəb *(kübarlar üçün)*; ~ **club** məhdud adamlar üçün klub; 4. birinci dərəcəli *(mehmanxana və s. haq.)*; ~ **hotel** birinci dərəcəli mehmanxana; ~ **shop** çox bahalı mağaza

**exclusively** [ɪks'klu:sɪvlɪ] *adv* son dərəcə, yeganə, məhz, ancaq, təkcə, bircə

**exclusiveness** [ɪks'klu:sɪvnɪs] *n* 1. müstəsnalıq, xüsusilik, qeyri-adilik; 2. məhdudluq; örtülülük, qapalılıq

**excoriate** [eks'kɔ:rɪeɪt] *v* 1. dərisini soymaq, sıyırmaq, sürtmək, sürtüb yaralamaq; 2. bərk tənqid etmək, tənqid atəşinə tutmaq

**excoriation** [eks.kɔ:rɪ'eɪʃn] *n* 1. sıyrıntı, cırmaq yeri/yarası; 2. amansız/bərk tənqid

**excursion** [ɪks'kɜ:ʃn] *n* 1. ekskursiya; tənəzzöh; turist səfəri; **to go on an** ~ ekskursiyaya/turist səfərinə getmək; 2. bir qrup ekskursant/ekskursiyaçı; 3. ekskurs *(köməkçi məsələni aydınlaşdırmaq üçün əsas mövzudan kənara çıxma)*; **an** ~ **into the historical domain** tarixə ekskurs; 4. kənara çıxma, uzaqlaşma *(mövzudan, fəndən)*

**excursionist** [ɪks'kɜ:ʃnɪst] *n* 1. ekskursant, turist; 2. *d.d.* ekskursiyanın təşkilatçısı; turist şirkətinin agenti/müvəkkili

**excusable** [ɪks'kju:zəbl] *adj* üzrlü, bağışlana bilən, bağışlanması/keçilməsi mümkün olan

**excusably** [ɪks'kju:zəblɪ] *adv* üzrlü, bağışlana bilən; *He was excusably irritated Onun hirslənməsi bağışlana bilərdi*

**excuse**[1] [ɪks'kju:s] *n* 1. bağışlama, günahından /təqsirindən/suçundan keçmə, əfv etmə; üzr; *There is no excuse for it Bu bağışlana bilməz; Give them my excuse Mənim adımdan onlardan üzr istə*; 2. təmizə çıxartma, bəraət qazandırma; haqlı çıxartma; bəraət; bəhanə; **lame/poor/thin** ~ zəif/inandırıcı olmayan bəhanə; *This is no excuse Buna bəraət qazandırmaq olmaz*; **without good** ~ üzrsüz səbəb; **to make/to offer** ~**s** özünü təmizə çıxartmaq, bəhanə tapmaq; *He had numerous excuses to offer for being late Gecikməsinə bəraət qazandırmaq üçün o çoxlu bəhanələr tapdı*; **an** ~ **for a prosecution** məhkəməyə cəlb etmək üçün bəhanə; **an** ~ **for aggression** təcavüz üçün bəhanə; 3. azad etmə *(vəzifədən, işdən və s.)*

**excuse**[2] [ɪks'kju:z] *v* 1. bağışlamaq; *Excuse me! Bağışlayın, günahkaram!; Please, excuse my interruption Bağışla/Bağışlayın, sözünü /sözünüzü kəsirəm; Excuse my glove Bağışlayın, əlcəyimi çıxartmadım (əl verərkən); Excuse me for coming late, Excuse my coming late Gecikdiyimə görə bağışla/bağışlayın*; 2. bəraət/haqq qazandırmaq; *This does not excuse him Bu, ona bəraət qazandırmır*; **to** ~ **oneself** üzr istəmək; özünü təmizə çıxartmaq, bəhanə gətirmək; *He excused himself by saying he was not well-disposed O, naxoşluğunu bəhanə gətirərək özünü təmizə çıxartdı*; 3. azad etmək *(vəzifəsindən, işindən)*; *I cannot excuse you from attending the classes Mən səni/sizi dərslərdən azad edə bilmərəm*; **to** ~ *smb.* **from attendance** bir kəsi iştirak etmədən azad etmək; *He asked to be excused from the lesson O, dərsdən buraxılmasını xahiş etdi*; **to** ~ **from military duty** *hərb.* hərbi xidmətdən azad etmək *(xəstəliyə görə)*

**excuseless** [ɪks'kju:zlɪs] *adj* bağışlanılmaz; bəraəti olmayan

**executable** ['eksɪkju:təbl] *adj* yerinə yetirilə /həyata keçirilə/icra edilə bilən

**execute** ['eksɪkju:t] *v* 1. yerinə yetirmək; icra /əməl etmək, həyata keçirmək *(əmri, sərəncamı və s.)*: **to** ~ **a plan** planı həyata keçirmək; **to** ~ **an order** sifarişi/əmri/ sərəncamı yerinə yetirmək; **to** ~ **a purpose** fikri/niyyəti həyata keçirmək; **to** ~ **the will of the president** prezidentin arzusunu yerinə yetirmək; **to** ~ **a piece of work** işi yerinə yetirmək; **to** ~ **fire** *hərb.* atəş açmaq *(topdan və s.)*; 2. ifa etmək, oynamaq *(rol və s.)*; *The part of Hamlet was badly executed Hamlet rolunu pis oynadılar*; 3. edam etmək; *The murderer was executed Cani edam edildi*; 4. *hüq.* həyata keçirmək, icra etmək *(məhkəmənin qərarını/hökmünü və s.)*; 5. qanuniləşdirmək, qanuni şəklə salmaq *(müqaviləni, etibarnaməni, vəkalətnaməni və s.)*

**executer** ['eksɪkju:tə[r]] *n* = **executor**

**execution** [.eksɪ'kju:ʃn] *n* 1. ifa, icra; əməl/ ifa etmə, yerinə yetirmə, həyata keçirmə /keçirilmə; **to carry** *smth* **into** ~, **to put** *smth.* **in** ~ bir şeyi həyata keçirmək/ icra etmək; ~ **of an order** sifarişin/əmrin yerinə yetirilməsi; ~ **of the plan** planın həyata keçirilməsi/icrası; ~ **of an office** xidməti vəzifənin yerinə yetirilməsi; **a man of** ~ bacarıqlı/işgüzar adam; 2. ifa etmə ustalığı *(incəsənət əsərini)*; *The pianist has marvellous execution Pianoçu çox gözəl ifaçılıq ustalığına malikdir*; 3. ölüm cəzası; ~ **by hanging** boğazdan asmaqla ölüm cəzası; 4. *hüq.* həyata keçirmə, icra etmə *(məhkəmə qərarını/hökmünü)*

**executive**[1] [ɪg'zekjutɪv] *n* 1. **(the ~)** icra hakimiyyəti; **(the ~)** icra orqanı; **Chief Executive** ABŞ-ın prezidenti; 2. rəhbər, başçı, administrator, müdir; 3. *amer.* əməkdaş, iş yoldaşı, xidmətçi, qulluqçu

**executive**[2] [ɪg'zekjutɪv] *adj* 1. icra; ~ **power** icra hakimiyyəti; ~ **secretary** məsul katib; icraçı katib *(BMT orqanlarında)*; 2. hökumət, prezident, prezidentə aid olan; **the** ~ **head of the nation** dövlət başçısı; 3. *amer.* dövlət başçısı, prezident; ~ **agent** *amer.* prezidentin xaricdə şəxsi nümayəndəsi; ~ **order** *amer.* hökumət sərəncamı/əmri; ~ **agreement** icraiyyə müqaviləsi *(prezident və xarici dövlətlər tərəfindən bağlanan və senatın təsdiqini tələb etməyən)*; ~ **discretion** *amer.* prezidentin səlahiyyətində olan /prezident tərəfindən həll olunan bir sıra məsələlər; ~ **department** *amer.* nazirlik, idarə *(müəssisə)*; ayrı-ayrı ştatların müdiriyyəti; idarətmə şöbəsi; ~ **business** *amer.* inzibati məsələlər *(iclasın gündəliyində)*; prezident tərəfindən senatın müzakirəsinə təqdim olunan/verilən məsələlər; **Executive Mansion** *amer.* ştat qubernatorunun iqamətgahı; *tar.* prezidentin iqamətgahı; 4. inzibati; təşkilatçılıq; ~ **duties** inzibati vəzifələr; ~ **ability** təşkilatçılıq qabiliyyəti

**executive committee** [ɪg'zekjutɪvkə'mɪtɪ] *n* 1. icraiyyə komitəsi; 2. *amer.* prezident yanında komissiya; prezident tərəfindən təyin olunmuş komissiya

**executor** [ɪg'zekjutə[r]] *n* 1. qəyyum, vəsiyyətnaməni yerinə yetirən; 2. məhkəmə iclasçısı

**exemplary** [ɪg'zemplərɪ] *adj* 1. nümunəvi, örnək; nümunə götürməyə layiq; ~ **pupil** nümunəvi şagird; ~ **courage** nümunəvi cəsarət; 2. ibrətli, ibrətamiz, faydalı; *The punishment was severe but exemplary Cəza çox ağır, lakin ibrətamiz idi*

**exemplify** [ɪg'zemplɪfaɪ] *v* 1. aydınlaşdırmaq, başa salmaq, izah etmək; **to** ~ **a rule** qaydanı misalla başa salmaq/izah etmək; 2. misal gətirmək, misalla aydınlaşdırmaq/izah etmək; 3. *hüq.* surətini çıxartmaq və təsdiq etmək *(imza və möhürlə)*

**exempt**[1] [ɪg'zemt] *n* imtiyazlardan/güzəştlərdən istifadə edən şəxs

**exempt**[2] [ɪg'zemt] *adj* 1. azad edilmiş; lazım olmayan; ~ **from taxation/duties** vergidən /gömrükdən azad edilmiş; 2. azad *(nöqsanlardan və s.)*; ~ **from passions** ehtirassız; 3. xüsusi imtiyazlardan istifadə edən, imtiyazlı; ~ **class** *amer.* imtiyazlı sinif

**exempt**[3] [ɪg'zemt] *v (pt, pp* **exempt***)* azad etmək *(vəzifədən və s.)*; **to** ~ **from taxation** vergidən azad etmək; *Poor eyesight will exempt you from military service Zəif görmən/görməniz səni/sizi hərbi xidmətdən azad edəcək*

**exemption** [ɪg'zemʃn] *n* 1. azad etmə *(bir şeydən)*; ~ **from duties/from military service / from taxation** rüsumdan/hərbi xidmətdən/vergidən azad etmə; 2. imtiyaz; aradan qaldırma /götürmə, ləğv/kənar etmə; güzəşt; **to claim** ~ **for dependents** öhdəsində olan adamların sayına görə imtiyaz tələb etmək

**exercise**[1] ['eksəsaɪz] *n* 1. məşq, çalışma, təmrin, *pl* çalışmalar, məşğələlər, təlimlər kompleksi; **five-finger** ~**s** fortepianoda məşqlər; **map** ~**s** xəritə üzərində təlim məşğələləri; **compulsory** ~**s** *id.* məcburi təmrinlər; **voluntary/optional** ~**s** *id.* sərbəst təmrinlər; **floor/free** ~**s** *id.* sərbəst təmrinlər/hərəkətlər; 2. çalışma *(qrammatikada)*, məsələ; misal *(hesabdan)*; 3. bədən gimnastikası, gəzmə, gəzinti, ayaqseyri, üzmə, üzgüçülük; **to take** ~ gəzmək, gimnastika etmək; *You do not take enough exercise Sən/Siz az hərəkət edirsən/edirsiniz*; 4. həyata keçirmə, yerinə yetirmə, tətbiq etmə/edilmə, işlətmə, işlədilmə, göstərmə, göstərilmə; ~ **of rights** hüquqların həyata keçirilməsi; ~ **of parental authority** valideyn vəzifələrinin yerinə yetirilməsi; 5. *pl amer.* mərasim, təntənə, şadlıq, şadyanalıq, şənlik, bayram, qonaqlıq; **graduation** ~**s** kolleci bitirmək münasibətilə təntənəli yığıncaq; 6. *pl* adət, qayda, ənənə, ayin, mərasim; **religious** ~**s** dini mərasimlər, kilsə xidmətləri; 7. *hərb.* təlim, məşq; döyüş hazırlığı; **military** ~**s** hərbi manevrlər/təlimlər

**exercise**[2] ['eksəsaɪz] *v* 1. məşq etmək/etdirmək, inkişaf etdirmək, öyrətmək, təlim vermək; **to** ~ **the body with some labour** fiziki əməklə bədəni inkişaf etdirmək; **to** ~ *smb.* **in swimming** bir kəsi üzgüçülük üzrə məşq etdirmək; 2. təlim keçmək *(həm də* **to** ~ **oneself***)*; **to** ~ **oneself in fencing** qılınc oynatmağı məşq etmək; 3. gəzmək, hərəkət etmək, yerimək; *You do not exercise enough Sən/Siz kifayət qədər hərəkət etmirsən/etmirsiniz*; 4. həyata keçirmək, yerinə yetirmək, tətbiq etmək, işlətmək; **to** ~ **administration** idarə etmək; **to** ~ **control** nəzarət/idarə etmək; **to** ~ **function** funksiyanı yerinə yetirmək; 5. həyəcanlandırmaq, əsəbiləşdirmək, narahat etmək, təşvişə salmaq; **to be** ~**d about/over** *smth.* bir şeyə görə həyəcan keçirmək/narahat olmaq; 6. yerinə yetirmək *(tapşırıqları)*

**exert** [ɪg'zɜ:t] *v* gərmək, gərginləşdirmək, güc vermək/göstərmək; **to** ~ **all** *one's* **strength** bütün gücünü qoymaq; **to** ~ **every effort** hər cür səy göstərmək; **to** ~ **influence** təsir göstərmək; **to** ~ **oneself** səy/cəhd etmək, çalışmaq, can yandırmaq; *He didn't exert himself much O çox da səy göstərmədi/özünə əziyyət vermədi, O özünə zəhmət vermədi*

**exertion** [ɪg'zɜ:ʃn] *n* 1. gərginlik; ~ **of memory** hafizənin/yaddaşın gərginləşməsi; *It was so hot that it seemed too much exertion even to breathe Elə isti idi ki, hətta nəfəs almaq belə çətin idi*; 2. səy, cəhd, can yandırma; **in spite of all his** ~**s** onun bütün cəhdlərinə/səylərinə bax-

mayaraq; 3. istifadə etmə; ~ **of one's authority** nüfuzundan istifadə etmə

**exhalation** [.eksə'leɪʃn] *n* 1. nəfəs vermə/çıxarma; 2. buxarlanma, buğlanma, çıxma *(qaz, buxar, buğ, tər, duman, sis)*; 3. buxar, buğ; duman, sis

**exhale** [eks'heɪl] *v* nəfəs buraxmaq/vermək; *Breathe deeply and then exhale slowly Dərindən nəfəs al/alın və sonra nəfəsini/nəfəsinizi yavaş-yavaş burax/buraxın*

**exhaust**[1] [ɪg'zɔ:st] *n tex.* 1. buraxma, buraxılma, işlənmiş qazın çıxması *(avtomobil, təyyarə və s. motorlarından)*; işlənmiş qazın çıxması üçün boru *(motorlarda)*; 2. işlənmiş qazlar *(motorda)*; vakuum *(qazın seyrəklik halı)* əmələ gəlməsi; 3. intensivlik, səmərəlilik, gərginlik, vakuumun dərinliyi; ~ **system** *tex.* sorucu sistem

**exhaust**[2] [ɪg'zɔ:st] *v* 1. tükətmək, qurtarmaq, sərf etmək, işlədib/sərf edib qurtarmaq, bitirmək; **to ~ resources** ehtiyatları tükətmək; **to ~ a subject** mövzunu bitirmək/qurtarmaq; **to ~ a well** quyunun suyunu işlədib/çıxarıb qurtarmaq; 2. yormaq, taqətdən/əldən salmaq, üzmək, zəiflətmək; **to ~ one's health** səhhətini korlamaq /pozmaq; **to ~ the soil** torpağı gücdən salmaq; **to ~ oneself** özünü çox yormaq/taqətdən salmaq; 3. seyrəkləşdirmək, çəkmək *(nasosla havanı)*; buraxmaq *(buxarı)*; 4. sərf edib/işlədib qurtarmaq *(faydalı qazıntıları)*

**exhausted** [ɪg'zɔ:stɪd] *adj* 1. əldən/gücdən düşmüş, çox üzgün/yorğun; **to feel ~** əldən düşmək, yorğunluq/zəiflik hiss etmək; **to be ~** qüvvədən/haldan düşmək, üzülmək; 2. gücdən düşmüş, münbit olmayan, məhsul verməyən *(torpaq haq.)*; 3. tükənən, qurtaran; *My patience is exhausted Səbrim tükənib*; ~ **edition** satılıb qurtarmış tiraj *(kitab və s. haq.)*

**exhauster** [ɪg'zɔ:stə'] *n tex.* 1. ekshauster, sorucu ventilyator; 2. aspirator *(hava, qaz, toz və s.-ni sormaq üçün cihaz)*; 3. tozsoran; tüstüsoran

**exhausting** [ɪg'zɔ:stɪŋ] *adj* yorucu, əziyyətli, üzücü, usandırıcı, çox ağır, əldən salan; ~ **day** üzücü/əziyyətli gün

**exhaustingly** [ɪg'zɔ:stɪŋlɪ] *adv* ətraflı surətdə/olaraq, müfəssəl

**exhaustion** [ɪg'zɔ:ʃn] *n* 1. üzülmə, haldan/ əldən düşmə, üzgünlük, çox yorğunluq, gücdən /qüvvədən düşmə *(torpaq)*; 2. qurtarma, tükənmə; **to be in a state of ~** yorğun halda/vəziyyətdə olmaq, gücdən düşmək; 3. çıxartma, sorma; 4. *tex.* buraxma; işlənmiş qazın çıxması *(avtomobil, təyyarə və s.-nin motorlarından)*

**exhaustive** [ɪg'zɔ:stɪv] *adj* 1. ətraflı, mükəmməl, müfəssəl, əsaslı, qəti; ~ **survey** müfəssəl/ətraflı şəkildə gözdən keçirmə; ~ **investigation** ətraflı araşdırma/tədqiq etmə; 2. zəifləyən, əldən düşən

**exhibit**[1] [ɪg'zɪbɪt] *n* 1. eksponat *(sərgidə, muzeydə nümayiş etdirilən şey)*; 2. göstərmə; nümayiş etdirmə, ekspozisiya; sərgi; **the British ~ at the World Fair** dünya yarmarkasında ingilis pavilyonu; 3. *hüq.* maddi sübut/dəlil

**exhibit**[2] [ɪg'zɪbɪt] *adj* sərgi; ~ **hall** sərgi zalı; ~ **rack** sərgi stendi/vitrini; **~s office** sərgiləri təşkil edən şöbə

**exhibit**[3] [ɪg'zɪbɪt] *v* 1. göstərmək, nümayiş etdirmək, qoymaq; **to ~ bravery** mərdlik/ mətanət göstərmək; *He exhibited his ignorance O öz nadanlığını göstərdi*; **to ~ paintings/flowers** şəkillər/güllər nümayiş etdirmək; **to ~ goods in a shop-window** malları mağaza vitrinində göstərmək/nümayiş etdirmək; 2. sərgidə iştirak etmək, sərgiyə qoymaq, sərgidə nümayiş etdirmək; *This artist exhibits in all art galleries Bu rəssam bütün şəkillərini şəkil qalereyalarında nümayiş etdirir*; 3. irəli sürmək; **to ~ a charge** ittiham irəli sürmək; 4. *hüq.* maddi sübut təqdim etmək; 5. *tib.* dərman vermək

**exhibition** [.eksɪ'bɪʃn] *n* 1. sərgi, nümayiş etdirmə; **art ~** incəsənət sərgisi; ~ **of flowers** gül sərgisi; **industrial ~** sənaye malları sərgisi; 2. göstərmə; **an ~ of bad manners** tərbiyəsizlik/ədəbsizlik göstərmə; **an opportunity for the ~ of one's knowledge** biliyini nümayiş etdirmə imkanı; **to make an ~ of oneself** özünü pis tərəfdən göstərmək; öz nöqsanını/eybini nümayiş etdirmək; 3. eksponat, eksponatlar; 4. *amer.* açıq imtahan; 5. *dip.* təqdim etmə/edilmə *(səlahiyyətləri və s.)*; 6. *hüq.* məhkəməyə təqdim etmə *(sənədləri və s.)*; 7. *tib.* dərman təyin/qəbul etmə

**exhibitioner** [.eksɪ'bɪʃnə'] *n* 1. eksponent *(sərgiyə şey qoyan adam; eksponat sahibi)*; 2. təqaüdçü, stipendiya alan

**exhibitor** [ɪg'zɪbɪtə'] *n* 1. eksponent *(sərgiyə şey qoyan adam)*; 2. kirayə vermə hüququ almış kinoteatr sahibi

**exhibitory** [ɪg'zɪbɪtərɪ] *adj* 1. sərgi; 2. nümayiş üçün qabaqcadan təyin edilmiş; 3. nümunə, nümunəvi

**exhilarate** [ɪg'zɪləreɪt] *v* 1. şənləndirmək, əyləndirmək, güldürmək; 2. canlandırmaq, ürək/cəsarət vermək, cürətləndirmək, həvəsləndirmək, ruhlandırmaq

**exhilarated** [ɪg'zɪləreɪtɪd] *adj* 1. sevincli, şad, şən, şux; 2. qızğın, gümrah, diribaş, möhkəm, qıvraq; 3. sərxoş, kefli

**exhilarating** [ɪg'zɪləreɪtɪŋ] *adj* 1. həvəsləndirən, ruhlandıran, canlandıran, qızışdıran, fəaliyyəti artıran; 2. kefləndirən, başgicəlləndirən *(hava, müvəffəqiyyət və s. haq.)*

**exhilaration** [ɪg.zɪlə'reɪʃn] *n* 1. şadlıq, şənlik, sevinc, nəşə, əyləncə; 2. keflənmə; 3. canlanma

**exhort** [ɪg'zɔ:t] *v* 1. çağırmaq; **to ~ smb. to good**



**deeds** bir kəsi xeyirxah işlərə çağırmaq; 2. öyüd/nəsihət vermək, yola gətirmək, dilə tutmaq, ağıl/dərs vermək

**exhortation** [.egzɔ:'teɪʃn] *n ədəb.* 1. arzu, niyyət, məqsəd, meyl, səbəb; 2. öyüd, nəsihət, öyüd/nəsihət vermə; 3. *din.* moizə

**exhortative** [ɪg'zɔ:tətɪv] *adj* öyüdverici, nəsihətamiz, nəsihətverici; ibrətli, ibrətamiz, ibrətverici

**exhorter** [ɪg'zɔ:tə'] *n* moizəçi, vaiz, təbliğçi

**exhumation** ['ekshju:meɪʃn] *n* ekshumasiya *(məhkəmə tibbi müayinə üçün meyitin qəbirdən çıxardılması)*

**exhume** [eks'hju:m] *v* 1. qazıb çıxartmaq *(torpaqdan, yerdən)*; meyiti qəbirdən çıxartmaq; 2. tapmaq, əldə etmək *(məlumat və s. haq.)*

**exile**[1] ['eksaɪl] *n* 1. sürgün; sürgün etmə/ edilmə; **to send smb. into ~** bir kəsi sürgün etmək; bir kəsi sürgünə göndərmək; *Napoleon was sent into exile Napoleon sürgünə göndərildi; Napoleon died in exile Napoleon sürgündə öldü*; **to live in ~** sürgündə yaşamaq; **to go into ~** mühacirət etmək *(siyasi səbəbdən)*; **to condemn to ~** ölkədən sürgün olunmağa məhkum etmək; 2. sürgün edilmiş adam; mühacir

**exile**[2] ['eksaɪl] *v* sürgün etmək; sürgünə göndərmək; *He was exiled for life O, ömürlük sürgün edildi*

**exist** [ɪg'zɪst] *v* 1. var/mövcud olmaq; *Water exists in milk Südün tərkibində su var; Does life exist on Mars? Marsda həyat varmı?; There exists a number of books on the subject Bu məsələyə aid bir sıra kitab var*; 2. yaşamaq, mövcud olmaq; *We cannot exist without air Biz havasız yaşaya bilmərik; How do they exist in such conditions Bu cür şəraitdə onlar necə yaşayırlar?*; 3. olmaq, rastlaşmaq, təsadüf etmək; *Lime exists in many soils Çox yerlərdə əhəngə təsadüf edilir*

**existence** [ɪg'zɪstns] *n* 1. var/mövcud olma, yaşama, varlıq; **the ~ of civilization** mədəniyyətin mövcudluğu; **the ~ of a fact** faktın mövcud olması; **in ~** mövcud olan, olan *(təbiətdə)*; **agreements already in ~** mövcud olan razılaşmalar/sazişlər/ müqavilələr; **to call into ~** yaratmaq; 2. həyat, mövcudiyyət; *Air and water are necessary for existence Hava və su həyat üçün vacibdir*; **to lead a dangerous ~** təhlükəli həyat sürmək

**exit**[1] ['eksɪt] *n* 1. çıxış; **no ~** çıxış yoxdur; ~ **into space** kosmosa/kainata çıxış; 2. getmə *(aktyorun səhnədən)*; yox olma, itmə, ölüm; **to make one's ~** 1) səhnədən getmək; 2) ölmək

**exit**[2] ['eksɪt] *v* 1. getmək, çıxıb getmək; ~ **Hamlet** Hamlet çıxıb gedir *(pyesdə müəllifin verdiyi izahat)*; 2. *məc.* ölmək

**exogamic** [.eksou'gæmɪk] *adj biol.* ekzoqamiya, ekzoqam; ekzoqamiya gözləyən, ekzoqamiya adətlərinə riayət edən

**exogamous** [ek'sɔgəməs] *adj biol.* ekzoqamiya; ~ **marriage** bir tayfanın/nəslin hüdudlarından xaricdə olan nikah; ekzoqam nikah/kəbin

**exogamy** [ek'sɔgəmɪ] *n* ekzoqamiya *(öz tayfasından, qohum-əqrəbasından evlənməyi qadağan edən adət)*

**exonerate**[1] [ɪg'zɔnərɪt] *adj* təmizə çıxardılmış, bəraət almış/qazandırılmış, hüququ özünə qaytarılmış

**exonerate**[2] [ɪg'zɔnəreɪt] *v* azad etmək *(öhdəlikdən, məsuliyyətdən və s.)*; **to ~ from duties of a citizen/from a liability** vətəndaşlıq vəzifəsindən/borcundan azad etmək; 2. *hüq.* təmizə çıxartmaq, bəraət qazandırmaq, hüququnu özünə qaytarmaq; **to ~ from blame** ittihamı götürmək, təqsirsiz hesab etmək; **to ~ smb. charged with theft** bir kəsdən oğurluq ittihamını götürmək; 3.: **to ~ oneself** təmizə çıxmaq, bəraət qazanmaq; *He exonerated himself of a greater crime O daha böyük cinayətdə özünün günahsızlığını sübut etdi*

**exoneration** [ɪg.zɔnə'reɪʃn] *n* 1. azad etmə *(öhdəliklərdən, məsuliyyətdən və s.)*; 2. təmizə çıxartma, bəraət qazandırma, hüququnu özünə qaytarma

**exotic**[1] [eg'zɔtɪk] *n* 1. *bot.* ekzotlar *(bir yer üçün səciyyəvi olmayan, lakin həmin iqlimə uyğunlaşdırılmış ağac və kol bitkiləri)*, ekzotik bitkilər; 2. qəribə, qeyri-adi *(qadın)*; 3. xarici söz *(dildə)*; 4. yadelli, əcnəbi, gəlmə

**exotic**[2] [eg'zɔtɪk] *adj* 1. ekzotik; *bot.* ekzotik, yadelli, əcnəbi *(bitkilər/quşlar haq.)*; ~ **flowers /birds** ekzotik çiçəklər/quşlar; 2. cəlbedici, qeyri-adi; ~ **clothes** cəlbedici/qeyri-adi paltar

**expand** [ɪks'pænd] *v* 1. genişləndirmək, inkişaf etdirmək, yaymaq; *Education expands the mind Təhsil əqli inkişaf etdirir*; **to ~ cultural exchanges** mədəniyyət mübadiləsini genişləndirmək/inkişaf etdirmək; **to ~ the volume of trade** ticarətin həcmini genişləndirmək; 2. artmaq, inkişaf etmək; *Milk production is expanding Süd məhsulu artır*; 3. artırmaq *(miqdarı, həcmi)*; qabartmaq; **to ~ a bridgehead** *hərb.* müharibə meydanını genişləndirmək; **to ~ the chest** *id.* döş qəfəsini qabartmaq; 4. artmaq *(ölçüdə, həcmdə)*; *Metals expand when they are heated Qızdırılanda metallar genişlənir*; 5. geniş açmaq; *The breeze expanded the flag Külək bayrağı geniş açdı*; 6. genişlənmək, çevrilmək, ...şəklinə düşmək *(genişlənərək)*; *The river expanded into a lake Genişlənərək çay gölə çevrildi*; 7. şərh /izah etmək, təfərrüatı ilə başa salmaq; müfəssəl danışmaq; 8. ünsiyyətli/mehriban/səmimi olmaq; 9. açmaq *(formulu, düsturu)*

**expanded** [ɪks'pændɪd] *adj* 1. geniş; ~ **edition** geniş nəşr; ~ **reproduction** *iqt.* geniş təkrar istehsal; 2. *poliqr. məc.* böyük şrift

**expander** [ıks'pændəʳ] *n* **1**. genəldici *(alət)*; **2**. *tex*. borunun ağzını genəldən alət

**expanding** [ıks'pændıŋ] *adj* **1**. genişlənən, artan, böyüyən, inkişaf edən; ~ **universe** *astr*. inkişaf edən kainat; **2**. açan, açılan *(gönçə və s. haq.)*; **3**. genişlənən *(həcmcə)*; **4**. *tex*. sıyırma, açılan *(stol və s.)*

**expanse** [ıks'pæns] *n* **1**. məkan; fəza; boş yer; sahə; **2**. uzunluq, məsafə, genişlik, açıqlıq, geniş meydan/sahə; **the ~ of heaven** səmanın/göyün genişliyi; **the broad ~ of the ocean** okeanın ucsuz-bucaqsız səthi/sahəsi; **3**. artırma, çoxaltma, böyütmə, artım, genişlənmə

**expansibility** [ıks,pænsə'bılıtı] *n* genişlənmə qabiliyyəti; elastiklik

**expansible** [ıks'pænsəbl] *adj* **1**. genişlənə bilən; **readily ~ by heat** qızdırılma zamanı genişlənə bilən; **2**. *məc*. hər cür məna verilə bilən

**expansion** [ıks'pænʃn] *n* **1**. artma, genişlənmə, inkişaf, yayma/yayılma; **~ of armaments** silahlanmanın genişlənməsi/yayılması; **~ in cultural exchanges** mədəni mübadilədə inkişaf; **~ of the currency** pul tədavülünün genişlənməsi; **2**. genişlətmə, dartıb uzatma, artma *(həcmcə)*; **3**. *tex*. genişlənmə *(istiliyin təsiri altında)*; **4**. məkan; fəza; boş yer; sahə, məsafə; genişlik, geniş meydan/sahə; **the starred ~ of the skies** göyün ucsuz-bucaqsız ulduzlu sahəsi; **5**. ekspansiya, genişlənmə, yayma *(dövlətlərin yeni torpaq, müstəmləkə və bazarlar əldə etmək məqsədilə öz siyasi və iqtisadi nüfuzunu başqa dövlətlərə yaymaq üçün yeritdikləri təcavüzkar siyasət)*; **territorial ~** ərazinin genişlənməsi; **6**. təfsilatı ilə ifadə etmə, şərh/ izah etmə; **7**. *riyaz*. formulun/düsturun açılması

**expansionist** [ıks'pænʃənıst] *n* ekspansionist, ekspansionizm tərəfdarı

**expansive** [ıks'pænsıv] *adj* **1**. ekspansiv, həddən artıq coşğun; hisslərini gizlədə bilməyən; **~ smile** hüsn-rəğbət oyadan təbəssüm; **2**. genişlənən, genişlənə bilən; **~ materials** genişlənən/genişlənə bilən materiallar; **3**. geniş, böyük; **~ glittering lake** böyük parlayan göl; **~ intellect** böyük ağıl/zəka; **~ forehead** gen/açıq alın; **4**. təmtəraqlı *(həyat tərzi haq.)*; **5**. sərbəst, istənilən kimi; **~ interpretation** sərbəst izahat/təfsir

**expansiveness** [ıks'pænsıvnıs] *n* ekspansivlik, həddən artıq ürəyi açıqlıq

**expatriate**[1] [eks'pætrııt] *n* vətənini tərk etmiş adam, mühacir; **American ~s in Paris** Parisdə amerikan mühacirləri

**expatriate**[2] [eks'pætrııt] *adj* vətənindən imtina edən; vətənini tərk edən; mühacirlik edən *(başqa ölkəyə köçən)*

**expatriate**[3] [eks'pætrıeıt] *v* **1**. vətənini tərk etmək, vətənindən qovmaq/çıxartmaq; vətəndaşlıqdan məhrum etmək; vətəndən sürgün etmək; **2**.: **to ~ oneself** mühacirət etmək, başqa ölkəyə köçmək; vətəndaşlıqdan imtina etmək

**expatriation** [eks,pætrı'eıʃn] *n* **1**. vətənini tərk etmə, könüllü və ya məcburi olaraq öz vətənindən getmə, vətəndaşlıqdan məhrum olma/etmə; vətənindən sürgün etmə/edilmə; **2**. mühacirət, vətəndaşlıqdan imtina etmə; **right of ~** vətənini tərk etmə/mühacirət hüququ; **3**. andı içməkdən imtina etmək

**expect** [ıks'pekt] *v* **1**. gözləmək; *I expected you yesterday Mən səni/sizi dünən gözlədim; Don't expect me for dinner Məni nahara gözləmə/gözləməyin; We never expected this Biz bunu heç vaxt gözləmirdik*; **2**. güvənmək, arxalanmaq, ümid olmaq, bel bağlamaq; *I expect to be back on Sunday Mən bazar günü qayıtmağa ümid edirəm; I expect you to work hard Mən ümidvaram ki, sən/siz inadla işləyəcəksən/işləyəcəksiniz*; **3**. tələb etmək; *You do not expect me to do this work in a day, do you? Sən/Siz tələb etmirsən/etmirsiniz ki, mən bu işi bir gün ərzində edim, elə deyilmi?*; **4**. *d.d.* güman/fərz/zənn etmək; *I expect he'll come Zənn edirəm ki, o gələcək; The price is expected to rise higher Güman edilir ki, qiymət daha da qalxacaq; I expect you are hungry Zənn edirəm ki, sən/siz acsan/acsınız; I expect he was there Zənn/Güman edirəm ki, o orada olub*

**expectable** [ıks'pektəbl] *adj* gözlənilən, mümkün olan/ola bilən

**expectance** [ıks'pektns] *n* = **expectancy**

**expectancy** [ıks'pektnsı] *n* **1**. gözləmə; **2**. ümid, təvəkkül; **3**. mümkünlük, ehtimal; **~ of hitting** *hərb*. hədəfi vurma ehtimalı

**expectant** [ıks'pektnt] *adj* **1**. gözləyən; **2**. güvənən, arxalanan, ümid olan, güman edilən; **~ heir** *hüq*. güman edilən vərəsə; **3**. gözləmə; **~ policy** gözləmə siyasəti; **~ treatment** *tib*. simptomatik müalicə; **4**. hamilə, ikicanlı, boylu; **~ woman** ikicanlı /hamilə/boylu qadın

**expectation** [,ekspek'teıʃn] *n* **1**. gözləmə; intizar; ümid; **in ~ of** ***smth***. bir şeyin intizarında; **against/contrary to ~** gözlənildiyinin əksinə olaraq; **beyond ~** gözlənildiyindən artıq; **2**. ümid, təvəkkül; **to answer/to meet/to come up to/to live up to ~(s)** ümidləri doğrultmaq; *We have great expectations of you Biz sənə/sizə böyük ümidlər bəsləyirik*; **to fall short of/not to come up to ~(s)** ümidləri doğrultmamaq; **3**. *pl* gələcək üçün planlar, varislik üçün planlar; **4**. mümkünlük, imkan, ehtimal, yəqinlik; **~ of life** ehtimal olunan orta ömür müddəti

**expected** [ıks'pektıd] *adj* təxmin/güman/ehtimal edilən, nəzərdə tutulan, gözlənilən

**expectorant** [eks'pektərnt] *n tib*. bəlğəm gətirən dərman



**expectorate** [eks'pektəreıt] *v* hayxırmaq, hayxırıb/öskürüb tüpürmək

**expectoration** [eks,pektə'reıʃn] *n* **1**. hayxırma, hayxırıb tüpürmə; **2**. bəlğəmin/hayxırığın ifrazı

**expedience** [ıks'pi:djəns] *n* **1**. məqsədəuyğunluq; **on grounds of ~** məqsədəuyğunluq əsasında; **2**. əlverişlilik, faydalılıq; səmərəlilik; münasiblik; vaxtlı-vaxtında olma

**expediency** [ıks'pi:djənsı] *n* = **expedience**

**expedient**[1] [ıks'pi:djənt] *n* məqsədə çatmaq üçün üsul/ hiylə/kələk/biclik/fənd

**expedient**[2] [ıks'pi:djənt] *adj* **1**. məqsədəuyğun; əlverişli, səmərəli, münasib, vaxtlı-vaxtında; *It is not expedient to interfere now İndi qarışmaq /müdaxilə etmək yersizdir*; **2**. zamanın tələblərinə uyğun olan; çevik *(gediş, addım və s. haq.)*

**expedition** [,ekspı'dıʃn] *n* **1**. ekspedisiya; **an ~ to the North Pole** Şimal qütbünə ekspedisiya; **2**. yürüş; səfər, hücum; **a hunting ~** ova getmə; **a fishing ~** balıq ovuna getmə; **3**. göndərmə, yollanılma, yollama *(qoşun, mal, əmtəə və s.)*

**expel** [ıks'pel] *v* **1**. qovmaq, çıxartmaq; xaric etmək; **to ~ a student from college** tələbəni kollecdən xaric etmək/çıxartmaq; **2**. *hüq*. sürgün etmək; **3**. itələyib/vurub çıxartmaq, tullamaq; **to ~ the enemy from his trenches** düşməni səngərindən vurub çıxartmaq; **4**. *məc*. buraxmaq; **to ~ smoke** tüstü buraxmaq

**expend** [ıks'pend] *v* **1**. **(on, upon)** xərcləmək; **to ~ money on** ***smth***. bir şeyə pul xərcləmək; **to ~ $1.000.000 upon a project** layihəyə/proyektə 1.000.000 dollar xərcləmək; **2**. sərf etmək *(vaxt, qüvvə və s.)*; **to ~ blood** qan axıtmaq; **3**. sərf edib qurtarmaq, istifadə etmək *(axıra qədər)* ; *Having expended their arrows, they drew their swords Ox ehtiyatları qurtardıqdan sonra onlar qılınclarını çıxartdılar*; **to ~ itself** xərclənmək, sərf olunmaq, tükənmək, işlənib qurtarmaq

**expendable** [ıks'pendəbl] *adj* **1**. istifadə olunan, xərc edilən, xərclənən; **~ property** xərclənən mülk/əmlak/mal/var; **2**. qayıtmaz, qaytarılmaz, qaytarıla bilməyən; **to be ~** bərpa edilməsi mümkün olmayan

**expenditure** [ıks'pendıtʃəʳ] *n* **1**. xərc, xərclənmə, xərc etmə, işlətmə, sərf etmə *(vəsait, material, qüvvə)*; **to meet ~s** xərci təmin etmək; *A car can be a considerable expenditure Maşın saxlamaq olduqca böyük xərc tələb edə bilər*; **2**. xərc, xərclər; **receipts and ~s** mədaxil və məxaric; **~ on armaments** silahlanma üçün xərclər

**expense** [ıks'pens] *n* **1**. xərc, xərcləmə; sərf etmə; **to go to ~** xərcə düşmək, pulları xərcləmək; **to go to the ~ of** ***smth***. bir şeyə vəsait/pul ayırmaq; **2**. *məc*. hesab, qiymət; **at our ~** bizim hesabımıza; **at the ~ of** ***one's*** **life** həyatı bahasına/hesabına; **to profit at the ~ of another** başqasının hesabına qazanc əldə etmək; **3**. *pl* xərclər; **incidental travelling ~s** təsadüfi yol xərcləri; **law/legal ~s** məhkəmə xərcləri; **~s of production** istehsal xərcləri

**expensive** [ıks'pensıv] *adj* **1**. baha, bahalı, baha qiymətli; **~ clothes** baha/baha qiymətli paltar; **~ furs** qiymətli xəzlər; **~ education** baha başa gələn təhsil; **2**. israfçıl, bədxərc; **~ man** israfçıl/bədxərc adam; *He has an expensive wife Onun israfçıl/bədxərc arvadı var*; **3**. **(of)** həddən artıq xərc tələb edən; **~ of time** həddən artıq çox vaxt tələb edən

**experience**[1] [ıks'pıərıəns] *n* **1**. təcrübə, həyat təcrübəsi; **to know by/from ~** təcrübədən bilmək; **to speak from ~** şəxsi təcrübəsi əsasında danışmaq; **2**. təcrübəçilik, təcrübə, səriştə; **a man of ~** təcrübəli/səriştəli adam; **3**. iş təcrübəsi; staj; **~ in teaching** müəllimlik stajı/təcrübəsi; **4**. hadisə, qəziyyə, əhvalat; macəra, sərgüzəşt; **alarming ~s** təhlükəli hadisələr; **strange /interesting/unpleasant ~** qəribə/maraqlı/xoşagəlməz hadisə; **5**. təəssürat; **childhood ~s** uşaqlıq təəssüratları; *Tell us about your experiences in Africa Afrika təəssüratların/təəssüratlarınız haqqında bizə danış/danışın*

**experience**[2] [ıks'pıərıəns] *v* **1**. sınamaq, yoxlamaq, sınaqdan keçirmək, təcrübədən çıxartmaq; **2**. hiss etmək, görmək, başına gəlmək, acısını dadmaq/çəkmək, çəkmək, keçirmək; **to ~ pain** ağrı hiss etmək; **to ~ joy** sevinc hissi keçirmək; **to ~ grief** qəm çəkmək;

◊ **to ~ religion** yeni din qəbul etmək

**experienced** [ıks'pıərıənst] *adj* **1**. təcrübəli, bilən, bilikli, bələd, məlumatlı, xəbərdar, işbilən, səriştəli; **2**. ixtisaslı; stajlı

**experiment**[1] [ıks'perımənt] *n* **1**. təcrübə, eksperiment, elmi təcrübə; **as an ~** eksperiment olaraq; **an ~ in chemistry/biology** kimya/biologiya sahəsində təcrübə; **2**. təcrübə aparma/qoyma; **to make/to carry out an ~** tərcübə aparmaq/qoymaq; **to prove** ***smth***. **by ~** bir şeyi eksperiment vasitəsilə sübut etmək

**experiment**[2] [ıks'perıment] *v* **1**. təcrübədən keçirmək, eksperiment aparmaq; **to ~ on guinea-pigs** hind donuzları üzərində təcrübə aparmaq; **to ~ with teaching methods** tədris metodikası sahəsində eksperiment aparmaq; **2**. *arx*. sınaqdan keçirmək, təcrübədən çıxarmaq

**experimental** [eks,perı'mentl] *adj* **1**. eksperimental, təcrübi, təcrübə; **~ physics/chemistry** təcrübi fizika/kimya; **~ farm** təcrübə təsərrüfatı/ferması; **~ plot** təcrübə sahəsi; **~ station** təcrübə stansiyası; **2**. nümunə, nümunəli, nümunə üçün, sınaq üçün edilən; **~ service** təcrübəvi/təcrübi istismar

**experimentalism** [eks,perı'mentəlızm] *n* **1**. *fəls*. empirizm; **2**. təcrübə etmə; təcrübə qoyma, təcrübəçilik

**experimentalist** [eks.perı'mentəlıst] *n* eksperimentator *(təcrübəçi, elmi təcrübə aparan mütəxəssis)*
**experimentally** [eks.perı'mentəlı] *adv* təcrübə yolu ilə; təcrübənin köməyi ilə, təcrübə əsasında; əməli olaraq
**experimentation** [eks.perımen'teıʃn] *n* təcrübə etmə/qoyma
**expert**[1] ['ekspə:t] *n* 1. mütəxəssis; **chemical ~** kimyaçı mütəxəssis; 2. yaxşı bilən/ tanıyan, bələd, ekspert *(bir məsələ haqqında qəti fikir söyləyən mütəxəssis)*; 3. *amer. hərb.* əla atıcı, birinci dərəcəli atıcı
**expert**[2] ['ekspə:t] *adj* 1. təcrübəli, bilən, bilikli, bələd, məlumatlı, xəbərdar, işdən başı çıxan, səriştəli; yüksək ixtisaslı; **~ accountant** yüksək ixtisaslı mühasib; **~ rifleman** *amer. hərb.* əla atıcı, birinci dərəcəli atıcı; **~ in/at driving a motor-car** təcrübəli avtomobil sürücüsü; 2. mütəxəssis, ekspert; **~ opinion** mütəxəssis/ ekspert rəyi
**expertise** [.ekspə:'ti:z] *n fr* 1. bilik, səriştə, bacarıq; erudisiya *(hər hansı bir sahədə dərin bilik, geniş məlumat)*; 2. ekspertiza *(bir qərara gəlmək üçün hər hansı bir məsələnin mütəxəssislər tərəfindən öyrənilməsi)*, mütəxəssislərin rəyi; 3. cəldlik, diribaşlıq, çeviklik, məharət; **a clever piece of ~** məharətli/ağıllı gediş
**expiration** [.ekspaıə'reıʃn] *n* 1. nəfəs vermə /çıxarma; 2. başa çatma, qurtarma; 3. *fon.* ekspirasiya *(ağ ciyərdən havanı buraxma)*, nəfəs vermə
**expire** [ıks'paıəʳ] *v* 1. nəfəs vermək, canı çıxmaq, ölmək; *He expired his last breath O öldü*; 2. qurtarmaq, ötmək, keçmək, bitmək *(vaxt haq.)*; *The terms of five judges shall expire at the end of three years Beş hakimin səlahiyyət vaxtı üç ildən sonra qurtaracaq*; 3. qüvvəsini itirmək *(qanun və s. haq.)*
**expiry** [ıks'paıərı] *n* 1. *hüq.* ötmə, keçmə, bitmə, qurtarma *(vaxt)*; **~ of a contract** müqavilənin vaxtının qurtarması; 2. *arx.* ölüm, vəfat
**explain** [ıks'pleın] *v* 1. izah etmək, anlatmaq, başa salmaq; **to ~ the meaning of a word** sözün mənasını izah etmək; *Explain this problem to me Bu məsələni mənə izah et/edin*; 2. təmizə çıxmaq, bəraət qazanmaq, izahat vermək; *He explained that he had been delayed by the rain O, izahat verdi ki, yağışa görə ləngiyib/gecikib; When he has done wrong, he never explains O, düzgün hərəkət etməyəndə heç vaxt özünə bəraət qazandırmır*; **to ~ oneself** öz davranışı haqqında izahat vermək;
◊ **to ~ away** səthi izahatla canını qurtarmaq; boyun qaçırmaq, bəhanə etmək/ gətirmək; *It will be difficult to explain away this error Bu səhvi izah etmək çətin olacaq*
**explainable** [ıks'pleınəbl] *adj* izah edilə/ başa salına bilən
**explanation** [.eksplə'neıʃn] *n* 1. izah, izahat, izah etmə; anlatma, başa salma; aydınlaşdırma, aydınlaşdırılma, şərh; **the ~ of difficulties** çətinliklərin izahı; **after repeated ~s** dəfələrlə izah etdikdən sonra; 2. söhbət, danışıq, razılaşma; *They had an explanation Onlar razılaşdılar*; 3. bəraət, əsas; **in ~ of his conduct** öz davranışına bəraət üçün; **legal ~** hüquqi əsas; **satisfactory ~** kifayətləndirici/qənaətbəxş izahat
**explanative** [ıks'plænətıv] *adj* izahedici, izahat
**explanatory** [ıks'plænətrı] *adj* izahedici, izahat; aydınlaşdırıcı, şərhedici; **~ notes at the back of a book** kitabın sonunda izahlı qeydlər; **~ guide card** soraq/arayış kartoçkası *(kataloqda)*
**explicable** ['eksplıkəbl] *adj* izah edilə/başa salına bilən, anlaşıla bilən
**explicate** ['eksplıkeıt] *v* izah etmək, başa salmaq, anlatmaq
**explication** [.eksplı'keıʃn] *n* izah, izahat, izah etmə/edilmə, anlatma, anladılma; başa salma/salınma; şərh, təfsir, interpretasiya
**explicit** [ıks'plısıt] *adj* 1. aydın, açıq, müfəssəl, ətraflı; tamamilə aşkar/aydın, açıq-aşkar; **~ consent** açıq-aşkar razılıq; 2. səmimi, ürəyiaçıq
**explicitly** [ıks'plısıtlı] *adj* aydın, aşkar, aşkarcasına, dürüst, düz, açıq, açıqcasına, açıq-açığına, düz-düzünə; *It was explicitly stated that... Açıq-açığına deyildi ki,...*
**explode** [ıks'ploud] *v* 1. partlatmaq; **to ~ a mine** mina partlatmaq; 2. partlamaq; *A bomb exploded Bomba partladı*; 3. dağıtmaq, yıxmaq, uçurtmaq, xarab/viran etmək; ifşa etmək; təkzib etmək; **to ~ a lie** yalanı ifşa etmək; **to ~ fallacy/a superstition** yanlış fikri/mövhumatı ifşa etmək; **to ~ a theory** nəzəriyyəni təkzib etmək; 4. çiçək açmaq *(gül haq.)*
**exploded** [ıks'ploudıd] *adj* 1. partladılmış, dağıdılmış; uçmuş, partlamış, uçurdulmuş; **~ custom** *məc.* köhnəlmiş/dövrü keçmiş adət; 2. sökülmüş vəziyyətdə; **~ view** sökülmüş vəziyyətdə mexanizmin təsviri
**exploit** [ıks'ploıt] *v* 1. istismar etmək; **to ~ the poor** kasıbları istismar etmək; **to ~ oil reserves** neft ehtiyatlarını istismar etmək; 2. istifadə/sui-istifadə etmək; **to ~ solar energy** günəş enerjisindən istifadə etmək; **to ~ *smb.'s* kindness** bir kəsin mehribanlığından sui-istifadə etmək; 3. *amer.* reklam vasitəsilə elan etmək, çıxartmaq; **to ~ product** malı/əmtəəni bazara çıxartmaq; bir şeyə tələbat yaratmaq
**exploitation** [.eksploı'teıʃn] *n* 1. istismar; **the ~ of cheap labour** ucuz əməyin istismarı; 2. istifadə etmə *(öz xeyri üçün)*; 3. işlədilmə, istismar etmə *(yataq haq.)*; **full ~ of all wells** neft quyularının tam istismarı/istifadəsi
**exploiter** [ıks'ploıtəʳ] *n* istismarçı
**exploration** [.eksplo:'reıʃn] *n* 1. araşdırma, araşdırılma, öyrənmə, öyrənilmə, tədqiq etmə/edilmə; tədqiqat *(coğrafi və s.)*; **cosmic/outer space ~** kosmosun/kainatın öyrənilməsi/tədqiq edilməsi; 2. *geol.* kəşfiyyat, axtarış *(yataq haq.)*; kəşfiyyat işləri; 3. *tib.* müayinə, müayinə etmə/edilmə, yoxlama



**exploratory** [eks'plo:rətrı] *adj* 1. tədqiqat; axtarış; **to drill an ~ well** axtarış/kəşfiyyat quyusu qazmaq; 2. nümunə üçün; **~ puncture** *tib.* nümunə üçün deşmə
**explore** [ıks'plo:ʳ] *n* 1. tədqiq etmək, öyrənmək; **to ~ the Antarctica/outer space** Antarktidanı /kosmosu/kainatı tədqiq etmək/öyrənmək; 2. araşdırmaq, kəşfiyyat aparmaq, üzə çıxartmaq; **to ~ possibilities of reaching an agreement** razılığa gəlmə imkanlarını araşdırmaq; **to ~ the economic conditions of the period** dövrün iqtisadi şərtlərini/şəraitini araşdırmaq; 3. *geol.* öyrənmək; kəşfiyyat aparmaq, axtarmaq; **to ~ for oil** neft kəşfiyyatı aparmaq; 4. *tib.* müayinə etmək; *The patient was explored Xəstə müayinə olundu/edildi*
**explored** [ıks'plo:d] *adj* öyrənilmiş, tədqiq edilmiş, araşdırılmış; **~ reserve** öyrənilmiş/tədqiq edilmiş ehtiyat
**explorer** [ıks'plo:rəʳ] *n* 1. tədqiqatçı; 2. *tib.* zond *(orqanizmin daxilini tədqiq etmək üçün cihaz)*
**explosion** [ıks'plouʒn] *n* 1. partlayış; partlama, püskürmə; **volcanic ~** vulkan püskürməsi; 2. qəhqəhə, qəzəb səsi; 3. sürətli inkişaf; **cultural/culture ~** mədəniyyətin sürətli inkişafı/tərəqqisi; **population ~, ~ of population** əhalinin sürətli artımı *(ölkədə)*; 4. *tex.* partlayış, partlama *(avtomobildə işlənmiş qaz xaric olarkən çıxartdığı səs)*
**explosive**[1] [ıks'plousıv] *n* partlayıcı maddə; **permissible ~** təhlükəsiz partlayıcı maddə
**explosive**[2] [ıks'plousıv] *adj* 1. partlayıcı; **~ substance** partlayıcı maddə; **~ force** partlayıcı qüvvə; 2. sürətli; **the ~ increase of population** əhalinin sürətli artımı; 3. hirsli, tez özündən çıxan, hövsələsiz, özünü saxlaya bilməyən *(insan, xarakter haq.)*
**explosiveness** [ıks'plousıvnıs] *n* partlama qabiliyyəti
**export**[1] ['ekspo:t] *n* aparılma, aparma, daşınma, daşıma *(miniklə)*; ixracat, ixrac, eksport *(xarici ölkələrə mal göndərilməsi)*, ixrac etmə/edilmə; **articles of ~** xarici ölkələrə göndərilə bilən şeylər
**export**[2] [eks'po:t] *v* ixrac etmək, xaricə göndərmək *(mal və s.)*
**exporter** [eks'po:təʳ] *n* xarici ölkələrə mal göndərən, eksportçu
**expose** [ıks'pouz] *v* 1. qoymaq, təsirinə məruz qalmaq *(günəşin, pis havanın və s.)*; **to be ~d to rain** yağışa düşmək; 2. düçar etmək/olmaq; **to ~ to unnecessary risks** lüzumsuz risklərə düçar etmək; **to be ~d to ridicule** gülünc obyektinə çevrilmək/ düçar olmaq; **to ~ to radiation** şüalanmaya düçar etmək/məruz qoymaq, şüalanma təhlükəsi yaratmaq *(bir kəs üçün)*; **to be ~d (to)** görüşmək, rastlaşmaq, təsadüf etmək, birdən /gözlənilmədən rast gəlmək; 3. açmaq, üstünü açmaq *(sirrin və s.)*, ifşa etmək; **to ~ deception/a plot** yalanın/ qəsdin üstünü açmaq; 4. göstərmək, nümayiş etdirmək; **to ~ goods for sale** malı satış üçün nümayiş etdirmək; **to ~ *one's* ignorance** avamlığını nümayiş etdirmək; **to ~ oneself** eybini/cinsi orqanlarını göstərmək; 5. başlı-başına buraxmaq / qoymaq; **to ~ a child** uşağı başlı-başına qoymaq/büraxmaq
**exposed** [ıks'pouzd] *adj* 1. açılmış; açıq, çılpaq, ifşa edilmiş; 2. *məc.* aydın, aşkar; 3. *hərb.* nəzarət üçün açıq; 4. *tex.* müdafiə olunmayan *(çəpərlə)*; təsirinə məruz qalan *(yanğının, korroziyanın və s.)*; **~ wall** bayır divar
**exposition** [.ekspə'zıʃn] *n* 1. izah, şərh, təfsir, izah /şərh etmə; başa salma; təsvir; təsvir etmə /edilmə; 2. sərgi; göstərmə, nümayiş, nümayiş etdirmə
**express**[1] [ıks'pres] *n* 1. *d.y.* ekspress *(sürətli qatar, gəmi və s.)*; 2. xidmətçi, kuryer *(1) idarələrdə kağız paylayan işçi; 2) təcili tapşırıqlar üçün göndərilən xidmətçi)*; 3. *hərb.* kağızpaylayan əsgər; 4. təcili məktub; poçtla təcili göndəriş; 5. nəqliyyat kontoru
**express**[2] [ıks'pres] *adj* 1. müəyyən, qəti, açıq, aydın, aşkar; dəqiq ifadə edilmiş; tamamilə aşkar/aydın; **~ command** dəqiq /aydın əmr; **~ wish** aydın ifadə olunan arzu; **~ assent** açıq ifadə olunan razılıq; 2. dürüst, doğru, düzgün, dəqiq; **~ image of a person** bir kəsin dəqiq surəti; 3. xüsusi, məxsus; qəsdən edilmiş; *He came with this express purpose O, xüsusi olaraq bu məqsədlə gəlib*; 4. təcili, tələsik; sürətli, tez, fövqəladə; **~ delivery** təcili çatdırma; **~ train** ekspress/sürətli qatar, sürət qatarı
**express**[3] [ıks'pres] *v* 1. ifadə etmək; **to ~ *one's* opinion** öz fikrini ifadə etmək; *I can't express to you how grateful I am Sənə/Sizə necə minnətdar olduğumu ifadə edə bilmirəm*; 2. əks etmək/etdirmək, göstərmək, bildirmək; *His face expressed sorrow Onun üzü qəm/qüssə ifadə edirdi*; **to ~ oneself** öz fikrini bildirmək; **to ~ oneself on *smth.*** bir şey haqqında öz fikrini bildirmək; **to ~ oneself in English** fikrini ingiliscə ifadə etmək; 3. təsvir etmək, təcəssüm/əks etdirmək, simvollarla göstərmək; 4. kuryer ilə göndərmək; 5. *amer.* nəqliyyat kontoru vasitəsilə göndərmək; 6. sürətli qatarla/sürət qatarı ilə getmək; 7. sıxmaq; **to ~ the juice from an apple, to ~ an apple** almanı sıxıb şirəsini çıxartmaq
**express**[4] [ıks'pres] *adv* təcili surətdə/olaraq, tələsik, çox tələsik; **to send *smth.* ~** bir şeyi təcili olaraq göndərmək; **to travel ~** sürətli qatarda/sürət qatarı ilə səyahət etmək

**express highway** [ɪks'pres'haɪweɪ] *n* avtostrada *(ikitərəfli avtomobil yolu)*
**expressible** [ɪks'presəbl] *adj* ifadə olunan/oluna bilən
**expression** [ɪks'preʃn] *n* 1. ifadə etmə *(bir şeyi)*; **beyond** ~ sözlə deyilə /ifadə edilə bilməyən; **to give** ~ ifadə etmək; **to find** ~ ifadəsini tapmaq; *His talent found expression in the plastic art Onun istedadı heykəltəraşlıqda öz ifadəsini tapdı*; 2. ifadə *(üzün, gözün və s.)*; *There was a quizzical expression on his face Onun üzündə tülkülük ifadəsi vardı, Onun sifətindən tülkülük yağırdı*; 3. ifadə; fraza, ibarə; **colloquial/literary** ~ danışıq dilində/ədəbi dildə işlənən ifadə; 4. mənalılıq, ifadəlilik, təsirlilik, səlislik; ifadə qüvvəti; **to read with** ~ ifadəli/təsirli oxumaq
**expressionless** [ɪks'preʃnlɪs] *adj* ifadəsiz, ifadə cəhətdən zəif; heç bir şey ifadə etməyən; **an ~ face/voice** ifadəsiz sifət/səs
**expressive** [ɪks'presɪv] *adj* 1. ekspressiv, mənalı, ifadəli, təsirli; ~ **function of language** dilin ekspressiv funksiyası; ~ **voice** təsirli səs; ~ **face** ifadəli/mənalı sifət; ~ **smile** mənalı təbəssüm; 2. emosional, həyəcanlı; ~ **means of language** dilin emosional ifadə vasitələri; 3. ifadə edən, ifadəyə xidmət edən; **a look ~ of hope/ despair** ümid/ümidsizlik ifadə edən baxış
**expressively** [ɪks'presɪvlɪ] *adv* mənalı, ifadəli, təsirli, mənalı-mənalı, təsirli tərzdə
**expressman** [ɪks'presmən] *n (pl* **-men** [-mən]) 1. *amer.* kuryer, ayaqçı; 2. nəqliyyat idarəsinin qulluqçusu
**expropriate** [eks'prouprɪeɪt] *v* 1. qəsb etmək, əlindən almaq, mülkiyyətdən məhrum etmək; 2. müsadirə/zəbt etmək, almaq *(zorla: ictimai ehtiyacı ödəmək üçün)*; 3. *hüq.* bir kəsi mülkiyyət hüququndan məhrum etmək
**expropriation** [eks,prouprɪ'eɪʃn] *n* 1. qəsb etmə, əlindən alma, mülkiyyətdən məhrum etmə; 2. müsadirə/zəbt etmə, alma *(zorla: ictimai ehtiyacları ödəmək üçün)*; 3. *hüq.* bir kəsi mülkiyyət hüququndan məhrum etmə
**expulsion** [ɪks'pʌlʃn] *n* 1. qovma, qovulma; sürgün etmə/edilmə; çıxarma, çıxarılma *(məktəbdən, klubdan və s.)*; azad etmə/ edilmə, kənar etmə/edilmə, çıxartma, çıxardılma *(nalayiq hərəkətlərinə və s. görə)*; 2. *hüq.* sürgün, sürgün etmə/ edilmə; 3. *tex.* çıxma, çıxartma; ~ **of gases** işlənmiş qazın çıxması
**exquisite** ['ekskwɪzɪt] *adj* 1. gözəl, zərif, incə, nəfis, nazik; qəşəng; ~ **beauty** zərif gözəllik; ~ **lace** zərif/incə krujeva/tor; ~ **poetry** zərif/incə poeziya; ~ **taste** incə zövq; ~ **workmanship** zərif/incə iş; 2. iti, kəskin, şiddətli, bərk, ağır; ~ **pain** kəskin /şiddətli ağrı; 3. kamil, mükəmməl, əla; **an ~ ear for music** musiqini əla /düzgün qavrama qabiliyyəti; ~ **gentleman** əsl/ həqiqi centlmen
**exquisiteness** ['ekskwɪzɪtnɪs] *n* 1. incəlik, zəriflik, gözəllik, qəşənglik; 2. hissin incəliyi/zərifliyi
**ex-service** ['eks'sə:vɪs] *adj* hərbi qüvvələrdə xidmət etmiş
**ex-serviceman** ['eks'sə:vɪsmən] *n (pl* **-men** [-mən]) 1. keçmiş/sabiq hərbi qulluqçu; 2. müharibə veteranı, keçmiş cəbhəçi; **an organization for ex-servicemen** müharibə veteranlarının təşkilatı
**extend** [ɪks'tend] *v* 1. uzatmaq, çəkmək, dartmaq; *The girl extended both her hands to him Qız hər iki əlini ona uzatdı*; **to ~ a rope** kəndiri/kanatı dartmaq; 2. uzanmaq; *The garden extends as far as the river Bağ çaya qədər uzanır; The road extends hundred miles Yol yüz mil uzanır*; 3. genişləndirmək, artırmaq; **to ~ a school building** məktəb binasını genişləndirmək; **to ~ the city boundaries** şəhərin sərhədlərini genişləndirmək; 4. artırmaq, yaymaq; **to ~ power /influence** hakimiyyəti/nüfuzu artırmaq; 5. uzatmaq *(vaxtı)*; **to ~ a visit** səfərin vaxtını uzatmaq; 6. vermək *(borc, kredit)*; **to ~ special privilege to** ***smb.*** bir kəsə xüsusi imtiyaz vermək; 6. ifadə etmək *(hüsn-rəğbət və s.)*; göstərmək, yetirmək *(diqqət)*; **to ~ a welcome** səmimiyyətlə qarşılamaq, səmimilik göstərmək; 7. *tex.* uzatmaq, calamaq; calayıb uzatmaq; artırmaq *(borunu, kəməri, kabeli)*;
◊ ~ **shorthand notes** stenoqramın/ stenoqrafik yazının şifrini açmaq
**extended** [ɪks'tendɪd] *adj* 1. uzadılmış; çəkilmiş, uzanmış; dartılmış, gərilmiş; 2. uzunsürən, uzunmüddətli, uzun-uzadı; **his ~ remarks** onun uzun-uzadı çıxışı; ~ **storage** uzunmüddətli saxlanma/saxlanılma; 3. geniş; **in an ~ sense** geniş mənada; ~ **sentence** geniş cümlə; 4. uzadılmış, artırılmış *(müddət, vaxt)*; ~ **warranty** təminatın uzadılmış müddəti
**extensible** [ɪks'tensəbl] *adj* uzadıla bilən; **an ~ ladder** uzadıla bilən nərdivan; ~ **credit** uzadıla bilən kredit
**extension** [ɪks'tenʃn] *n* 1. çəkmə, çəkilmə, uzatma, uzanma, dartma, dartılma, genəlmə, genəltmə; 2. uzunluq, sahə, ölçü *(boy, uzunluq, en haq.)*; 3. genişlənmə, genişləndirmə, genişləndirilmə; uzatma, uzadılma; ~ **of a railway** dəmiryol xətlərinin uzadılması; 4. yayma, yayılma; artma, genişlənmə; ~ **of useful knowledge** faydalı biliyin genişlənməsi; **the ~ of influence** təsirin/nüfuzun artması; 5. uzadılma *(müddət, vaxt haq.)*; təxirə salma/salınma; 6. sonradan əlavə edilmiş tikili; **a house with two ~s** iki əlavə tikilisi olan ev; 7.: **University Extension** universitetin nəzdində kurslar; axşam fakültəsi; 8. vermə *(kredit, yardım)*; 9. göstərmə *(xidmət, qonaqpərəstlik və s.)*
**extensive** [ɪks'tensɪv] *adj* geniş, böyük; iri; ~ **plantations** geniş/böyük plantasiyalar; ~ **knowledge** geniş bilik; ~ **front** *hərb.* geniş cəbhə; ~ **repairs** iri təmir
**extent** [ɪks'tent] *n* 1. uzunluq; məsafə, sahə, ölçü; ~ **of front** *hərb.* cəbhənin uzunluğu; *We were able to see the full extent of the park Biz parkın bütün sahəsini görə bildik*; 2. genişlik, həcm, sərhəd, hədd, hüdud; *I was amazed at the extent of his knowledge Mən onun biliyinin genişliyinə valeh oldum*; 3. dərəcə, ölçü, həcm, əndazə; **to a great ~** böyük ölçüdə/həcmdə, əhəmiyyətli dərəcədə; **to a certain ~** müəyyən dərəcədə; **to some ~** qismən, müəyyən dərəcəyə qədər; 4. ölçü, əndazə, böyüklük; **a serpent of huge ~** çox yekə ilan; ~ **of error** səhvin böyüklüyü
**extenuate** [eks'tenjueɪt] *v* 1. zəifləmək, azaltmaq, yumşaltmaq *(günahı)*, yüngülləşdirmək *(təqsiri)*; 2. bəraət qazandırmaq, üzürlü hesab edilmək; *Nothing can extenuate his wrong-doing Onun yaramaz hərəkətinə heç nə bəraət qazandıra bilməz*; 3. bəhanə tapmağa səy etmək
**extenuating** [eks'tenjueɪtɪŋ] *adj* yumşaldan, yüngülləşdirən, azaldan; *hüq.* ~ **circumstances** təqsiri yüngülləşdirən şəraitlər
**extenuation** [eks,tenju'eɪʃn] *n* 1. bağışlama, günahından/təqsirindən/suçundan keçmə, əfv etmə; 2. yorulma, üzülmə, haldan/əldən düşmə, üzgünlük, yorğunluq; arıqlama, zəifləmə
**extenuative** [eks'tenjuətɪv] *adj* yüngülləşdirən *(təqsiri)*
**extenuatory** [eks'tenjuətrɪ] *adj* yüngülləşdirən *(təqsiri, suçu)*, zəiflədən *(ağrını)*
**exterior¹** [eks'tɪərəʳ] *n* görünüş, görkəm, zahiri görünüş/görkəm; **nice/engaging/ rough ~** xoş/cazibədar/kobud görkəm; **house with imposing ~** əzəmətli fasadlı ev; *You mustn't judge people by their exteriors Adamlar haqqında onların xarici görkəminə görə mühakimə yürütmək olmaz*
**exterior²** [eks'tɪərəʳ] *adj* 1. xarici, zahiri, üzdən, bayır, səthi; **the ~ features of a building** binanın xarici/bayır görünüşü; ~ **angle** *riyaz.* xarici bucaq; ~ **guard** *hərb.* bayır gözətçisi/keşikçisi; ~ **shooting** *kino.* açıq havada çəkilən *(şəkil)*; 2. özgə, yad, kənar; **without ~ help** kənar kömək olmadan; 3. xarici; ~ **policy** xarici siyasət
**exterminate** [eks'tə:mɪneɪt] *v* 1. məhv/təlәf etmək, qırmaq, yoxa çıxartmaq; **to ~ rats** siçovulları məhv etmək/qırmaq; 2. kökünü kəsmək; **to ~ heresy** hədyanın kökünü kəsmək
**extermination** [eks,tə:mɪ'neɪʃn] *n* 1. məhv etmə /edilmə; yox etmə/edilmə; qırma, qırıb qurtarma, tələf etmə; 2. dezinfeksiya *(zərərli həşəratın məhv edilməsi)*; 3. detarizasiya *(siçan, siçovul və s. həşəratın kimyəvi vasitələrlə qırılması)*
**external¹** [eks'tə:nl] *n* 1. xaric, bayır, bayır tərəf; 2. *pl* zahir, süni, yalançı; ~**s of religion** dinin süniliyi; 3 *pl* zahiri görünüş, görkəm; **to judge things and people by ~s** şeylər və adamlar haqqında xarici görkəminə görə mühakimə yürütmək
**external²** [eks'tə:nl] *adj* 1. zahiri, xarici, bayır, üzdən; **the ~ walls of the building** binanın xarici/bayır divarları; ~ **angle** *riyaz.* xarici bucaq; ~ **action** xarici təsir; **for ~ use only** ancaq xarici istifadə üçün; ~ **cause** *tib.* xarici səbəb *(xəstəlik haq.)*; ~ **appearance** xarici görkəm; ~ **attack** xaricdən hücum/həmlə; ~ **force** xarici qüvvə; ~ **loan/trade** xarici borc/ticarət; ~ **relations** xarici əlaqələr; ~ **affairs** xarici işlər; 2. özgə, yad, kənar, bu məsələyə aid olmayan; ~ **consideration** kənar fikirlər/mülahizələr; 3. üzdən, zahiri, süni, yalançı; ~ **politeness** süni /yalançı nəzakət
**externally** [eks'tə:nəlɪ] *adv* 1. xaricdən, zahirdən, zahirən, üzdən; ~ **secreting gland** xarici sekresiya vəziləri; 2. bayırdan, xaricdən, kənardan, qıraqdan, üzdən
**extinct** [ɪks'tɪŋkt] *adj* 1. sönmüş, sönük, ölgün; ~ **volcano** sönmüş vulkan; 2. yox olmuş, qırılmış; nəsli kəsilmiş, qırılıb qurtarmış *(tayfa, heyvan növləri və s. haq.)*; ~ **animals** yox olmuş heyvanlar; 3. istifadədən çıxmış *(söz, adət və s. haq.)*
**extinction** [ɪks'tɪŋkʃn] *n* 1. söndürmə/sönmə *(odu, alovu, vulkanı və s.)*; 2. aradan qaldırma *(düşmənçiliyi)*; 3. yox olma, qırılma *(tayfa, heyvan növü haq.)*; 4. ölüb getmə, aradan qalxma, silinmə *(yer üzündən)*; ~ **of a meteor** meteorun yox olması /itməsi; 5. sönmə *(əhəng haq.)*
**extinguish** [ɪks'tɪŋgwɪʃ] *v* 1. söndürmək; 2. məhv/ yox / tələf etmək, qırmaq, yoxa çıxarmaq; 3. öldürmək, boğmaq *(ümidi, sevgini)*; **to ~ all memory thereof** bu haqda hər cür xatirəni yox etmək; 4. söndürmək, pozmaq *(sevinci)*; boğmaq *(ehtirası)*; 5. ödəmək *(borcu)*; 6. *hüq.* ləğv etmək *(sənədi)*
**extinguished** [ɪks'tɪŋgwɪʃt] *adj* 1. sönmüş; yox/qeyb olmuş; ~ **volcano** sönmüş vulkan; **waterfall** yox/qeyb olmuş şəlalə; 2. ödənilmiş *(borc)*
**extinguisher** [ɪks'tɪŋgwɪʃəʳ] *n tex* odsöndürən, yanğınsöndürən *(həm də* **fire** ~)
**extort** [ɪks'tɔ:t] *v* 1. qoparmaq, almaq, məcbur etmək, öyrənmək *(hədələməklə)*; **to ~ a confession** etiraf etməyə məcbur etmək; **to ~ a promise from** ***smb.*** bir kəsi söz verməyə məcbur etmək; **to ~ taxes** vergini zorla almaq; **to ~ a secret** sirri öyrənmək; 2. zorla/hədələməklə almaq/ qoparmaq *(pulu, malı, varı və s.)*
**extortion** [ɪks'tɔ:ʃn] *n* 1. zorakılıq, şantaj; zorla/hədələməklə/fırıldaqla alma/qoparma *(pul və s.)*; **to obtain money by ~** zorla/hədə-qorxu ilə pul qoparmaq; 2. alma, bilmə, öyrənmə *(sirr, söz)*
**extortive** [ɪks'tɔ:tɪv] *adj* 1. hədə ilə/zorla/fırıldaqla başqasından pul alan/qoparan; 2. zorakı, məcburi, zorla həyata keçirilən
**extra¹** ['ekstrə] *n* 1. *pl* xüsusi ödəmə, artıq vermə, artıq verilən pul; qiymət artırma; artırılmış

məbləğ; 2. fövqəladə buraxılış *(qəzet)*; 3. əla növ; 4. *amer. d.d.* müvəqqəti, mövsümi fəhlə

**extra²** ['ekstrə] *adj* 1. əlavə, əlavə /üstəlik verilən; ~ **time** əlavə vaxt *(futbol oyununda)*; ~ **care** əlavə qayğı; ~ **charges** əlavə xərclər; ~ **edition** əlavə tiraj; fövqəladə buraxılış *(qəzet haq.)*; ~ **hours** iş vaxtından əlavə saatlar; ~ **pay** əlavə ödəmə; əlavə maaş; ~ **postage** əlavə poçt haqqı; ~ **period/time** *id.* əlavə vaxt; ~ **fare/messing** *hərb.* əlavə yemək/qida/xörək; 2. xüsusi, qeyri-adi; ~ **size** böyük ölçü *(paltar)*; ~ **allowance/discount** xüsusi güzəşt; ~ **charge** xüsusi muzd/haqq

**extra³** ['ekstrə] *adv* artıq, əlavə; əlavə olaraq; ayrı, ayrıca, əlahiddə; xüsusilə; ~ **strong binding** xüsusilə möhkəm cild; **to work** ~ iş vaxtından artıq/əlavə olaraq işləmək

**extra-** ['ekstrə] *mürəkkəb sözlərin "kənar, xaric, əlavə, qeyri" mənalarına malik olan birinci tərkib hissəsi:* ~ -judicial məhkəmədən**kənar**; ~ -official adi vəzifədən**kənar**; ~ -material əlavə material

**extract¹** ['ekstrækt] *n* 1. cövhər, şirə, ekstrakt; **tanning** ~ aşılayıcı ekstrakt; 2. sitat, çıxarış, parça *(kitablardan götürülmüş)*; çıxarış *(sənəddən)*; 3. *hüq.* təsdiq edilmiş çıxarış *(sənəd haq.)*

**extract²** [ıks'trækt] *v* 1. çıxartmaq, çəkmək, çəkib /dartıb çıxartmaq; **to ~ a bullet** gülləni çıxartmaq; **to ~ a cork** probkanı (çəkib) çıxartmaq; **to ~ a tooth** diş çəkmək/ çıxartmaq; 2. sıxıb çıxartmaq; **to ~ a juice** sıxıb şirə çıxartmaq; 3. buğa/buxara vermək, buğa verib təmizləmək; 4. buxarlandırmaq, buxara çevirmək; 5. ekstrakt olmaq; 6. *kim.* ayırmaq; 7. çətinliklə /güclə əldə etmək *(razılığı və s.)*; **to ~ information** məlumat əldə etmək; 8. seçmək *(misallar, sitatlar)*; 9. almaq, götürmək *(fayda, xeyir, həzz, zövq, ləzzət)*; 10. *riyaz.* kök almaq

**extractable** [ıks'træktəbl] *adj* çıxardıla/götürülə/alına bilən

**extracted** [ıks'træktıd] *adj* əldə edilmiş, çıxardılmış; hasil edilmiş; ~ **honey** süzülmüş bal

**extraction** [ıks'trækʃn] *n* 1. çıxartma, çıxardılma, çəkib çıxartma; ~ **of stumps** kötükləri kökündən çıxartma; ~ **of a tooth** dişin çıxarılması; 2. sıxma, sıxıb çıxartma; çəkmə, çəkilmə, sorma; ekstraktın hazırlanması; 3. sitatların/misalların /parçaların seçilməsi/götürülməsi; 4. çıxartma, hasil etmə, istehsal; ~ **of ore** filizin çıxardılması/istehsalı

**extractor** [ıks'træktə'] *n tex.* 1. ekstraktor, ekstrakt çıxardan cihaz/maşın/mexanizm; 2. kəlbətin; qısqac; maşa; 3. sıxıcı sentrifuqa *(qarışıq maddələri/mayeləri mərkəzdənqaçan qüvvə vasitəsilə tərkib hissələrinə ayıran cihaz)*; **water** ~ rütubət separatoru; 4. *tib.* yad cismi çıxartmaq üçün alət

**extradite** ['ekstrədaıt] *v hüq.* 1. *bir dövlətin qanunlarını pozmuş şəxsi həmin dövlətə vermək*; 2. *amer.* dustağı digər ştata vermək

**extradition** [,ekstrə'dıʃn] *n hüq.* 1. ekstradisiya *(bir dövlətin qanunlarını pozmuş şəxsin həmin dövlətə verilməsi)*; 2. *amer.* cinayətkarın digər ştata verilməsi; ~ **treaty** cinayətkarın verilməsi haqqında müqavilə

**extrajudicial** ['ekstrədʒu:'dıʃl] *adj hüq.* 1. məhkəmədənkənar; ~ **confession** məhkəmədənkənar etiraf; 2. qeyri-rəsmi; baxılan işə aid olmayan; 3. aid olmayan *(məhkəmə orqanına)*

**extralegal** ['ekstrə'li:gl] *adj hüq.* qanunun təsiri altına düşməyən; qanunda nəzərdə tutulmayan

**extramarital** ['ekstrəmə'raıtl] *adj* kəbinsiz; ~ **affair** kəbinsiz cinsi əlaqə

**extra-military** ['ekstrə'mılıtrı] *adj hərb.* hərbi hissədən kənar

**extramural** ['ekstrə'mjuərl] *adj* 1. şəhərin/ qalanın divarları kənarında/arxasında baş verən; ~ **interment** şəhərin xaricinə basdırma/dəfn etmə; 2. qiyabi yaxud axşam *(fakültə, kurs haq.)*; məktəbdənkənar; ~ **work** məktəbdənkənar iş; ~ **courses/ teaching** kolleclərdə və universitetlərdə aparılan silsilə mühazirələr və praktik məşğələlər

**extra-national** ['ekstrə'næʃnl] *adj hüq.* bir millətin/dövlətin hüdudlarından kənara çıxan; beynəlxalq, beynəlmiləl, internasional

**extraordinarily** [ıks'trɔ:dnrılı] *adv* müstəsna/görünməmiş dərəcədə, qeyri-adi olaraq, son dərəcə, olduqca; ~ **beautiful/ difficult** müstəsna dərəcədə gözəl/çətin

**extraordinary** [ıks'trɔ:dnrı] *adj* 1. müstəsna, qeyri-adi; təəccüblü, çox gözəl/yaxşı/ qəşəng; görkəmli, məşhur, mühüm; **a man of ~ genius** müstəsna/qeyri-adi istedad; ~ **remedies** qeyri-adi dava-dərmanlar; 2. fövqəladə, xüsusi, müstəsna; ~ **measures** fövqəladə/müstəsna tədbirlər; ~ **session** fövqəladə/növbədənkənar sessiya/iclas; **on ~ occasions** xüsusi hallarda; 3. ştatdankənar, ştatdanxaric, ştatdan artıq; müvəqqəti *(işçi haq.)*; 4. fövqəladə *(səfir, diplomatik nümayəndə haq.)*

**extra-scientific** ['ekstrə,saıən'tıfık] *adj* elmin xaricində olan; elmi izaha gəlməyən

**extra-terrestrial** ['ekstrətı'restrıəl] *adj astr.* Yer kürəsindən kənar, Yer kürəsinin xaricində olan; ~ **vehicle** planetlərarası gəmi

**extraterritorial** ['ekstrə,terı'tɔ:rıəl] *adj dip.* eksterritorial, toxunulmaz

**extraterritoriality** ['ekstrə,terıtɔ:rı'ælıtı] *n dip.* eksterritoriallıq, toxunulmazlıq hüququ

**extra-uterine** ['ekstrə'ju:təraın] *adj tib.* uşaqlıq xaricində olan; ~ **gestation/pregnancy** uşaqlıq xaricində olan hamiləlik

**extravagant¹** [ıks'trævıgənt] *n* 1. bədxərc, israfçı; 2. qəribə/əcaib adam, dəli, dəlisov, cinli

**extravagant²** [ıks'trævıgənt] *adj* 1. israfcıl, bədxərc; ~ **tastes and habits** böyük xərc tələb edən zövqlər və adətlər; ~ **of time** vaxtını boş yerə sərf edən; 2. dəli, dəlisov, ağılsız, bildiyini edən



**extreme¹** [ıks'tri:m] *n* 1. ifratçılıq, ifrat; fövqəladəlik, müstəsnalıq; **in the** ~ son dərəcə, olduqca; **at the ~ of poverty** dəhşətli yoxsulluq/səfalət içində; **to run to an** ~ ifrata/ifratçılığa varmaq; **to go to ~s** ifrata varmaq, ifratçılıq etmək; 2. *pl* qəti ziddiyyət; tamamilə zidd mövzular/hadisələr; *Love and hate are extremes Sevgi və nifrət zidd hisslərdir*

**extreme²** [ıks'tri:m] *adj* 1. son, axır, sonuncu, axırıncı, ən son/axırıncı, son dərəcə; **at the ~ end** ən axırda; **the ~ edge/border of a field** tarlanın ən axırı; ~ **range** son hədd; ~ **old age** pirani qocalıq; ~ **youth** vaxtından əvvəl gələn/başlayan gənclik; ~ **patience** olduqca/son dərəcə böyük səbr; ~ **poverty** son dərəcə yoxsulluq; ~ **penalty** *hüq.* ölüm cəzası; 3. ifrat, ifratçı, qatı, ekstremist; **to hold ~ views** ifratçı baxışlara tərəfdar olmaq; 4. ekstremal; ~ **conditions** ekstremal vəziyyətlər

**extremely** [ıks'tri:mlı] *adv* çox, son dərəcə; fövqəladə, olduqca, müstəsna dərəcədə; *This problem is extremely difficult Bu problem çox/son dərəcə çətindir*

**extremeness** [ıks'tri:mnıs] *n* ifratçılıq, ifrat, yüksək dərəcə

**extremism** [ıks'tri:mızm] *n* ekstremizm *(siyasətdə ifrat tədbirlər və baxışlara meyl)*

**extremist¹** [ıks'tri:mıst] *n* 1. ekstremist *(siyasətdə tədbirlər tərəfdarı)*; ifrat baxışlar tərəfdarı olan adam; fövqəladə tədbirlər tərəfdarı; 2. ifratçı

**extremist²** [ıks'tri:mıst] *adj* ekstremist; ~ **views** ekstremist baxışlar

**extremistic** [,ekstrı'mıstık] *adj* ekstremizm, ekstremist; fövqəladə, qəti *(tədbirlər, məsləklər haq.)*

**extremity** [ıks'tremıtı] *n* 1. son, axır, qıraq, kənar, qurtaracaq; 2. *pl anat* əl-ayaq; 3. son dərəcə, ifrat, ifratçılıq; **an ~ of misery/caution** son dərəcə yoxsulluq/ehtiyac; **an ~ of joy** hədsiz/həddən artıq sevinc; 4. ağır/qorxulu/çıxılmaz vəziyyət; *Help them in their extremity Onlara ağır vəziyyətlərində kömək et/edin*; 5. *pl* qəti/ fövqəladə/sərt tədbirlər

**extrude** [eks'tru:d] *v* 1. çıxartmaq, itələyib/ vurub/sıxışdırıb çıxartmaq; 2. *məc.* qovmaq, sürgün etmək; aradan götürmək; 3. çıxmaq, qabağa çıxmaq, görünmək; 4. əndərmək, tökmək

**extrusion** [eks'tru:ʒn] *n* 1. itələyib/vurub çıxartma; 2. *məc.* qovma, qovulma; sürgün etmə/edilmə; yox etmə, aradan qaldırma/qaldırılma; 3. çıxıntı, çıxıq

**exuberance** [ıg'zju:bərəns] *n* 1. bolluq, çoxluq, artıqlıq; ~ **of vegetable growth** sıx/qalın yaşıllıq; ~ **of feeling** hisslərin çoxluğu; ~ **of high spirits** yüksək əhval-ruhiyyə, qarşısıalınmaz şadlıq/şənlik; 2. varlılıq, məhsulluluq, səmərəlilik

**exuberant** [ıg'zju:bərənt] *adj* 1. çox qəşəng, möhtəşəm, təmtəraqlı, dəbdəbəli, cah-calallı, bol, çox, çoxlu, dolu, zəngin, sıx, qalın *(yaşıllıq haq.)*; 2. daşan, qaynayan, coşan, fəvvarə vuran, qarşısıalınmaz; ~ **personality** qaynar/enerjili adam; 3. müstəsna, qeyri-adi, qəribə; ~ **talent** qeyri-adi istedad; 4. artıq; ~ **population** artıq əhali; 5. təmtəraqlı, gurultulu; qəşəng, gözəl, parlaq *(üslub və s. haq.)*; ~ **eloquence** gözəl danışma qabiliyyəti

**exult** [ıg'zʌlt] *v* **(in, at, on, over)** şadlıq/ şadyanalıq/şənlik/bayram etmək, şadlanmaq, sevinmək; **to ~ in a victory** qələbəni bayram etmək; **to ~ to find one has succeeded** öz müvəffəqiyyəti haqqında xəbəri eşidəndə sevinmək

**exultant** [ıg'zʌltnt] *adj* şadlanan, sevinən, şadlıq/şadyanalıq/ şənlik/bayram edən

**exultation** [,egzʌl'teıʃn] *n* 1. şadlıq, şənlik, şadyanalıq, şadlıq etmə, şadlanma, təntənə, bayram; 2. *pl* qalibiyyət nidası/nidaları

**eye¹** [aı] *n* 1. göz; **blue/brown/large ~s** mavi/qonur/böyük gözlər; **the whites of *one's* ~s** gözünün ağı; **with naked** ~ adi gözlə *(optik cihazların köməyi olmadan)*; *The sun/The light is in my eyes Günəş/ İşıq gözlərimə düşür*; **to cast down *one's* ~s** gözlərini yerə dikmək; **to cock *one's* ~** göz vurmaq/eləmək; **to screw up *one's* ~s** gözlərini qıymaq; **to put *one's* ~s together** gözünü yummaq, yatmaq; 2. *pl* baxış, nəzər; **to set/to lay/to clap ~s on *smth.*** bir şeyə göz yetirmək; **to run/to pass *one's* ~ over/through *smth.*** bir şeyi cəld gözdən keçirmək; 3. *məc.* fikir, rəy, mülahizə; **in the ~(s) of *smb.*** bir kəsin fikrincə; 4. dəlik, deşik, göz *(qapıda, iynədə və s.)*; 5. *jarq.* xəfiyyə, xəfiyyə agenti, casus; **private** ~ xüsusi xəfiyyə; 6. *jarq.* televizor ekranı; 7. şaxtanın ağzı; **to spoil *one's* ~s** gözlərini korlamaq; **sharp/keen** ~ iti göz; **to be unable to take *one's* ~ off** gözü qalmaq, gözünü ayıra bilməmək; **to be all ~s and ears** göz-qulaq olmaq; *Keep a sharp eye on this child Bu uşaqdan göz-qulaq ol/olun; The light of my eye Gözümün işığı/nuru*; **true** ~ sərrast göz; **to look danger /death straight in the** ~ təhlükənin/ölümün gözünə dik baxmaq; **in *smb.'s* ~s** bir kəsin gözündə; **to open *smb.'s* ~s** bir kəsin gözünü açmaq, bir kəsi başa salmaq; **to open *one's* ~s wide** gözünü bərəltmək; **to feel colic in the ~s** gözü sancmaq; **to put the evil ~s (on/upon)** göz dəymək, gözə gətirmək; **to keep *one's* ~ on** göz qoymaq; **disease of the** ~ göz xəstəliyi; **to measure by** ~ gözəyarı ölçmək; **with open** ~ açıq gözlə; **to have an ~ for beauty** gözəlliyi görmək/seçmək; **to have a good ~ for distance** gözlə məsafəni yaxşı müəyyən etmək; **to have**

~s at the back of *one's* head *məc.* boynunun arxasında gözü olmaq, hər şeyi görmək; **to have all *one's* ~s about one** bir kəs haqqında ayıq-sayıq olmaq; **with open ~s** şüurlu olaraq; **to make *smb.* open his ~s** bir kəsi təəccübləndirmək; **to close *one's* ~s** əbədi olaraq gözlərini yummaq, ölmək; **to give an ~ to the child** uşağa göz qoymaq; *Keep your eye on him! Ona göz qoy/qoyun!*; **to be in the public ~** tez-tez ictimai yerlərdə görünmək; **to wipe *smb.'s* ~s** bir kəsə təsəlli vermək; **to feast *one's* ~s** baxıb həzz/zövq almaq; **to burst upon the ~** gözə çarpmaq; *It strikes the eye, It leaps to the eye Bu, gözə çarpır*

**eye²** [aɪ] *adj* göz; ~ **disease** göz xəstəliyi; ~ **specialist** göz həkimi, oftalmoloq; ~ **hospital** göz xəstəxanası; ~ **glasses** eynək, gözlük

**eye³** [aɪ] *v* **1.** baxmaq, diqqətlə baxmaq, gözdən keçirmək; **to ~ *smb.* with suspicion** bir kəsə şübhə ilə baxmaq; **to ~ with curiosity** maraqla baxmaq; **2.** nəzarət altında saxlamaq, bir kəsdən gözünü ayırmamaq/çəkməmək

**eye-ball** [ˈaɪbɔ:l] *n* göz alması

**eye-brow** [ˈaɪbrau] *n* qaş; **to raise the ~s** qaşları qaldırmaq *(təəccüb, narazılıq və s. əlaməti olaraq)*

**eye-drop** [ˈaɪdrop] *n* **1.** göz yaşı; **2.** *pl* yaş damcıları

**eye-glass** [ˈaɪgla:s] *n* **1.** linza, okulyar; **2.** monokl *(təkgözlü eynək)*; **3.** *pl* gözlük, eynək, çeşmək

**eye-ground** [ˈaɪgraund] *n anat.* gözün dibi

**eye-lash** [ˈaɪlæʃ] *n* kirpik;

◊ **without turning an ~** ≡ gözünü qırpmadan, azacıq belə utanmadan/çəkinmədən

**eyeless** [ˈaɪlɪs] *adj* gözsüz; gözləri olmayan

**eyelid** [ˈaɪlɪd] *n* göz qapağı;

◊ **without batting an ~** gözünü yummadan; ≡ gözünü qırpmadan, azacıq belə utanmadan/çəkinmədən

**eye-memory** [ˈaɪˌmemərɪ] *n* görmə yaddaşı /hafizəsi

**eye-muscle** [ˈaɪmʌsl] *n anat.* göz əzələsi

**eye-shadow** [ˈaɪˌʃædou] *n* göz üçün karandaş *(kosmetika)*

**eyesight** [ˈaɪsaɪt] *n* **1.** görmə, görmə qabiliyyəti; **good/poor ~** yaxşı/pis görmə qabiliyyəti; **by/from *smb*'s ~** bir kəsin nöqteyi-nəzərindən; **2.** görüş dairəsi *(səviyyə, bilik dərəcəsi)*

**eye-wink** [ˈaɪwɪŋk] *n* **1.** göz qırpma/vurma /eləmə; **2.** gözlə edilən işarə

**eye-winker** [ˈaɪˌwɪŋkəʳ] *n* kirpik; göz qapağı

**eye-wise** [ˈaɪwaɪz] *adj* gözə ağıllı/müdrik görünən; dayaz, səthi *(adam)*

**eye-witness** [ˈaɪˈwɪtnɪs] *n* şahid *(bir hadisəni öz gözü ilə görmüş adam)*



# Ff

**F, f** [ef] *n* **1.** *(pl* **F's, f's** [efs]*) ingilis əlifbasının 6-cı hərfi;* **2.** *mus.* qammanın 4-cü notu

**f** [ef] *n (həm də* **fem)** **femel** *sözünün qısa forması*

**fa** [fa:] *n* **1.** *mus.* fa *(qammanın dördüncü notu)*; **2.** *n* = **fan**

**fabaceous** [fəˈbeɪʃəs] *adj bot.* paxla, lobya

**Fabian¹** [ˈfeɪbjən] *n siya.* Fabiçi *(İngiltərədə Fabi cəmiyyətinin üzvü / tərəfdarı)*

**Fabian²** [ˈfeɪbjən] *adj* **1.** *tar.* Romada Fabiyev nəslinə aid olan; **2.** Fabi; ~ **Society** Fabi cəmiyyəti; **3.** ehtiyatlı, ləng; gözləmə *(taktika, metod haq.)*; ~ **policy** gözləmə siyasəti

**Fabianizm** [ˈfeɪbjənɪzm] *n siya.* fabiçilik; Fabi hərəkatı; Fabi məfkurəsi

**fabiform** [ˈfeɪbɪfɔ:m] *adj bot.* paxlavari, paxlaşəkilli, paxla formalı, paxla formasına malik olan

**fable¹** [ˈfeɪbl] *n* **1.** təmsil; **Aesop's ~s** İsopun təmsilləri; **2.** uydurma, yalan; *This is a mere fable Bu sadəcə olaraq uydurmadır;* **old wives' /women's ~s** yalan, uydurma, ara söhbəti; **3.** əfsanə, mif, əsatir; xurafat

**fable²** [ˈfeɪbl] *adj* təmsil; ~ **book** təmsil kitabı, təmsillər toplusu; ~ **writer** təmsilçi, təmsil yazan

**fable³** [ˈfeɪbl] *v* **1.** *şair.* təmsil yazmaq; yalan uydurmaq, nağıl/yalan danışmaq; **to say verity and not to ~** doğru/düz danışmaq, uydurmamaq; **2.** boşboğazlıq/naqqallıq etmək

**fabled** [ˈfeɪbld] *adj* **1.** əfsanəvi; **2.** uydurulmuş; **a ~ monster** uydurulmuş div

**fabler** [ˈfeɪbləʳ] *n* **1.** təmsil uyduran/danışan adam; **2.** yalan uyduran, yalançı, uydurmaçı, iftiraçı

**fabric** [ˈfæbrɪk] *n* **1.** parça; qumaş; **silk/ woolen /cotton ~s** ipək/yun/pambıq parçalar; **2.** struktur, quruluş; **the ~ of society** cəmiyyətin quruluşu; **the social ~** ictimai quruluş; *The whole fabric of society was torn apart by the war Müharibə cəmiyyətin bütün quruluşunu dağıtdı/darmadağın etdi*; **3.** məmulat, mal, məhsul; fabrikat; **4.** bina, qurğu, tikili, tikinti, inşaat; **5.** parça, arşın malı

**fabricate** [ˈfæbrɪkeɪt] *v* **1.** uydurmaq, qondarmaq, düzəltmək, quraşdırmaq; *The story was fabricated from beginning to end Əhvalat başdan axıra qədər uydurulmuşdu;* **to ~ a charge** ittiham uydurmaq/qondarmaq; **2.** saxtalaşdırmaq, saxtakarlıq etmək; **to ~ papers** sənədləri saxtalaşdırmaq; **to ~ a will** vəsiyyətnaməni saxtalaşdırmaq; **3.** tikmək, qurmaq; **4.** hazırlamaq, hazır/standart hissələrdən yığmaq

**fabricated** [ˈfæbrɪkeɪtɪd] *adj* yığılmış, quraşdırılmış *(hazır hissələrdən)*; ~ **barge** hazır hissələrdən quraşdırılmış barj; ~ **house** standart/birtipli hissələrdən quraşdırılmış ev

**fabrication** [ˌfæbrɪˈkeɪʃn] *n* **1.** uydurma, qondarma, yalan; *His story was an entire fabrication Onun hekayəsi tamamilə uydurma / qondarma idi;* **2.** saxta, qəlp; *The document was undoubtedly a fabrication Sənəd, şübhəsiz saxta idi;* **3.** bina, qurğu, tikili, tikinti; **4.** *tex.* qəlibləmə, qəlibləmə, ştamplanma, ştamplama, qəlibə tökmə/tökülmə; qəlib; **5.** hazır hissələrdən yığma / quraşdırma *(ev və s.)*

**fabulate** [ˈfæbjuleɪt] *v* **1.** yalan qondarmaq/ uydurmaq; **2.** yalan/nağıl/təmsil danışmaq

**fabulator** [ˈfæbjuleɪtəʳ] *n* **1.** yalançı, iftiraçı, böhtançı; **2.** hekayə/nağıl danışan

**fabulist** [ˈfæbjulɪst] *n* **1.** təmsilçi, təmsil yazan; **2.** yalançı, iftiraçı, böhtançı *(adam)*

**fabulize** [ˈfæbjulaɪz] *v arx.* təmsil uydurmaq/quraşdırmaq, özündən təmsil qondarmaq; yalan uydurmaq

**fabulous** [ˈfæbjuləs] *adj* **1.** uydurulmuş; əfsanəvi, mifik; ~ **beasts** əfsanəvi heyvanlar; ~ **hero** əfsanəvi qəhrəman; ~ **description** uydurulmuş təsvir; ~ **wealth** əfsanəvi sərvət; **2.** təmsil / yalan uyduran

**fabulously** [ˈfæbjuləslɪ] *adv* **1.** yalan, doğruya oxşamayan / həqiqətə uyğun olmayan tərzdə; *The voyages, indeed, are fabulously narrated Dəniz səyahətləri həqiqətə uyğun olmayan bir tərzdə nağıl edilir;* **2.** çox güclü, inanılmayacaq dərəcədə; son dərəcə, ağlasığmaz dərəcədə; *Her cruelties were fabulously exaggerated Onun qəddarlığı son dərəcə şişirdilmişdi; He is reported to be fabulously wealthy Deyirlər ki, o, ağlasığmaz dərəcədə varlıdır*

**fabulousness** [ˈfæbjuləsnɪs] *n* **1.** müstəsnalıq, qeyri-adilik, əfsanəvilik; **2.** saxtalıq, yalan, uydurma, qondarma; doğruya oxşamama, həqiqətə uyğun olmama

**facade** [fəˈsa:d] *n fr* **1.** fasad *(binanın ön tərəfi)*; **the stately ~ of the new building** yeni binanın əzəmətli fasadı; **2.** xarici görünüş, zahiri cəhət; **the whole ~ of this theory** bu nəzəriyyənin bütün zahiri cəhəti

**face¹** [feɪs] *n* **1.** üz, sifət, surət; **a pretty ~** qəşəng sifət/üz; **a handsome ~** gözəl sifət/üz; *Go and wash your face Get/Gedin üzünü/üzünüzü yu/yuyun;* **2.** burun *(heyvanda)*; **3.** üzün ifadəsi; sir-sifət; ~ **of a dying calf** üzün giciəhər/melanxolik ifadəsi; *His face fell Onun sir-sifəti dəyişdi (təəccübdən, pərtlikdən və s.)*; **straight ~** ehtirassız/soyuq sir-sifət *(heç bir şey ifadə et-*

*məyən);* **to straighten** *one's* **~** üzünün ifadəsini dəyişməmək, sakit olmağa çalışmaq; **4.** *d.d.* ağız-burnunu əymə, üz-gözünü büzüşdürmə; mimika; **to make/to pull a ~** ağız-burun əymək, üz-göz büzüşdürmək; **5.** xarici görünüş; **on/upon the ~ of (it)** zahiri görünüşünə görə; ilk baxışdan; *On the face of it you are guilty Üz-gözündən/Üz-gözünüzdən görünür ki, sən/siz təqsirkarsan/təqsirkarsınız; The idea is absurd on the face of it İlk baxışdan bu fikir mənasız görünür;* **to carry on its ~** tamamilə aydın olmaq; **6.** *d.d.* həyasızlıq, sırtıqlıq; **to have the ~ (to say** *smth.***)** bir şeyi demək üçün üzü olmaq; **7.** üz, səth *(yerin, suyun, parçanın, oyun kartlarının, medalın və s.);* **to lie on its ~** üzüstə uzanmaq; **8.** *arx.* qabaqdan görünüş, fasad; **9.** *tex.* kəsik, kəsik yeri, kəsilmiş yer; tiyənin ağzı *(iti tərəfi);* **10.** mədən, quyu dibi *(şaxtalarda, mədənlərdə);* **11.** en *(taxtada);* **12.** üz çəkmə/ çəkilmə *(divara, kitaba)*

**face²** [feɪs] *adj* üz, üzlük; üz üçün; **~ powder** üz pudrası, kirşan; **~ brick** üzlük kərpic;

◊ **on the ~ of the earth** yer üzündə; **from/off the ~ of the earth** yer üzündən; **in the ~ of** baxmayaraq, əksinə, ziddinə, zidd olaraq; **to act in the ~ of orders** əmrin əksinə/ziddinə hərəkət etmək; **to succeed in the ~ of many difficulties** çox çətinliklərə baxmayaraq nailiyyət/müvəffəqiyyət qazanmaq; **~ to ~** üz-üzə; şəxsən, təklikdə; üzbəüz, üzbəsurət, üzbəgöz; *Let's get together and talk whole thing over face to face Gəl/Gəlin görüşək və hər şey haqqında üzbəüz/üz-üzə söhbət edək;* **at/in/on the first ~** ilk baxışdan; **to have two ~s** ikiüzlü/riyakar olmaq; **to show a false ~** ikiüzlülük/riyakarlıq göstərmək; **in/to** *smb.'s* **~** üzünə, açıq; **to laugh in** *smb.'s* **~** bir kəsin üzünə gülmək; **to look full in/into the ~ of** *smb.* bir kəsin üzünə düz baxmaq; **to fly in the ~ (of)** iddialanmaq, lovğalanmaq, özünü igid göstərmək, kişilənmək; **to fly in the ~ of facts** faktlara baxmayaraq inkar etmək; **to put/to set** *one's* **~ against** *smth.* bir şeyə qətiyyətlə etiraz etmək; **to put a new ~ on** *smth.* bir şeyi digər tərəfdən/nöqteyi-nəzərdən təqdim etmək; **to lose ~** *məc.* sifətini/simasını itirmək; **to save** *(one's)* **~** rüsvayçılıqdan canını qurtarmaq; öz nüfuzunu/ləyaqətini xilas etmək; **from ~ to foot** *arx.* başdan-ayağa/ təpədən-dırnağa qədər; **to be in ~** *arx.* əla görünmək; **a ~ as long as a fiddle** qüssəli/qəmli sifət; *The face is the index of the mind ≅ Üz qəlbin güzgüsüdür / aynasıdır*

**face³** [feɪs] *v* **1.** üzünü bir kəsə/şeyə döndərmək; *Turn round and face me Dön/Dönün və üzünü/üzünüzü mənə çevir/çevirin;* **2.** qarşılamaq, qarşılaşmaq; sinə gərmək; **to be ~d with a difficulty** çətinliklə üzləşmək/qarşılaşmaq; *He faced the difficulty with courage O, çətinliyi cəsarətlə qarşıladı, O, çətinliyə cəsarətlə sinə gərdi;* **3.** qarşıda durmaq; *Stand facing the light İşığın qarşısında dur/durun; Üzünü/ Üzünüzü işığa çevir/çevirin;* **4.** baxmaq *(pəncərə, ev və s. haq.); My window faces north/the street Mənim pəncərəm şimala/küçəyə baxır;* **5.** üzə baxmaq; *I can't face him after the accident O hadisədən sonra mən onun üzünə baxa bilmirəm; I can't face work today – I feel too ill Mən bu gün işə baxa bilmirəm – Özümü çox xəstə/pis hiss edirəm;* **6.** cəsarətlə qarşılamaq; **to ~ danger** təhlükəni cəsarətlə qarşılamaq, təhlükənin üzünə dik baxmaq; **7.** bəzəmək, bəzək vermək *(paltara, geyimə);* **to ~ a coat with gold braid** paltonu qızıl sapla bəzəmək; **8.** üz çəkmək; **to ~ a building with marble** binaya mərmərdən üz çəkmək; *The front of the brick house was faced with cement Kərpic binanın fasadına sementdən üz çəkilmişdi;* **9.** cilalamaq, hamarlamaq, pardaqlamaq; yonmaq; **to ~ a stone** daşı hamarlamaq/ yonmaq; *This stone has not been faced properly Bu daş lazımi tərzdə hamarlanmayıb/yonulmayıb; Right face! (komanda) Sağa dön!;*

◊ **to ~ the knocker** qapı-qapı gəzib sədəqə istəmək; **to ~ the music** öz hərəkətinə cavab vermək; çətinliyi/təhlükəni cəsarətlə qarşılamaq

**face-bone** [ˈfeɪsboun] *n* almacıq sümüyü

**face-cloth** [ˈfeɪsklɔθ] *n* **1.** yumşaq hamam lifi; **2.** meyitin üzünə salınmış örtük

**faced** [ˈfeɪst] *adj* üz çəkilmiş; **~ wall** üz çəkilmiş divar

**face-fungus** [ˈfeɪs.fʌngəs] *n jarq.* saqqal, bığ

**face-guard** [ˈfeɪsga:d] *n* qoruyucu maska *(üz üçün)*

**faceless** [ˈfeɪslɪs] *adj* **1.** üzsüz, üzü olmayan; simasız; **a ~ statue** üzü şikəst edilmiş heykəl; **2.** adsız, imzasız

**face-lift¹** [ˈfeɪslɪft] *n* **1.** üzün plastik operasiyası *(kosmetik məqsədlə edilən),* "kosmetik" təmir; qırışın və s. aradan götürülməsi; **2.** *məc.* üzdən təzələmə *(binanı, otağı və s.)*

**face-lift²** [ˈfeɪslɪft] *v* **1.** üzdə plastik operasiya etmək; qırışları və s. aradan götürmək; **2.** təmir etmək *(binanı, otağı və s.)*

**face-mould** [ˈfeɪsmould] *n tex.* qəlib, şablon, lekal

**face-off** [ˈfeɪsˈɔf] *n* iki rəqib arasında şaybanın atılması *(hokkey oyununda)*

**face-paint** [ˈfeɪspeɪnt] *n* ənlik; qrim; ənlik /kirşan vurma

**face-painter** [ˈfeɪs.peɪntəʳ] *n* **1.** yanaqları/ gözləri və s. boyayan adam; yanaqlara/ gözlərə bəzək verən adam; **2.** qrimçi, qrim edən; **3.** portretçi/portretçəkən rəssam

**face-painting** [ˈfeɪs.peɪntɪŋ] *n* kosmetikadan həddən artıq istifadə etmə

**facer** [ˈfeɪsəʳ] *n* **1.** *d.d.* üzə vurulan zərbə; **to give a ~** üzə zərbə vurmaq; **2.** *amer.* gözlənilməyən çətinliklər; **3.** *amer.* krujka; parç; qədəh; **4.** *jarq.* bir stəkan viski/punş



**face-saver** [ˈfeɪs.seɪvəʳ] *n* şöhrətini / yaxşı adını/nüfuzunu qorumaq üçün edilən hiylə yaxud atılan addım

**face-saving** [ˈfeɪs.seɪvɪŋ] *n* şöhrəti/şərəfi/ adını qoruma; **an unsuccessful attempt at ~** adını/nüfuzunu qorumaq üçün edilən uğursuz cəhd

**face-stone** [ˈfeɪsstoun] *n* üzlük daş

**facet¹** [ˈfæsɪt] *n* **1.** kənar *(almazda, kristalda və s.);* **2.** baxış, nöqteyi-nəzər; **to study all the ~s of the matter** məsələni bütün cəhətlərdən öyrənmək; **3.** faset *(taraş edilmiş daşın, büllurun və s. üzü)*

**facet²** [ˈfæsɪt] *v* taraş etmək, yonmaq, cilalamaq; **to ~ a diamond** almazı taraş etmək/yonmaq/cilalamaq

**facete** [fəˈsi:t] *adj arx.* hazırcavab; zarafatçı, zarafatcıl; hənəkçi; əyləncəli, məzəli, gülməli, qəribə, maraqlı

**faceted** [ˈfæsɪtɪd] *adj* taraşlı, taraş edilmiş; cilalanmış, cilalı

**facetious** [fəˈsi:ʃəs] *adj* **1.** şən, şux, sevincli; zarafatcıl, ağıllı, hazırcavab; **~ reply** ağıllı cavab; **~ story** gülməli əhvalat; **~ companion** məzəli/hazırcavab/söhbət yoldaşı

**face-value** [ˈfeɪs.vælju:] *n* **1.** nominal dəyər *(malın, pulun və s. üstündə yazılan qiymət);* **2.** zahiri qiymət; **to take/to accept** *smth.* **at its ~** bir şeyi xarici görkəminə görə qiymətləndirmək; *I took his promise at face-value Mən onun vədini ciddi qəbul etdim, Mən onun vədinə inandım*

**face-wall** [ˈfeɪswɔ:l] *n* fasad/üz divar

**face-work** [ˈfeɪswə:k] *n tik.* **1.** üzlük iş, üzlük daşla / kərpiclə hörmə

**facia** [ˈfeɪʃə] *n* lövhə

**facial** [ˈfeɪʃl] *adj* **1.** üz, sifət; **~ expression** üz ifadəsi; **~ nerve** *anat.* üz əsəbi; **~ palsy/paralysis** *tib.* üz iflici; **2.** kosmetik; **~ massage** kosmetik masaj *(üzdə)*

**facile** [ˈfæsaɪl] *adj* **1.** asan, əziyyətsiz, səy/ güc tələb etməyən; **~ victory / success** asan qələbə/müvəffəqiyyət; **2.** iti, çevik, zirək; sərbəst, asan *(üslub haq.);* rəvan *(nitq haq.);* **~ manners** sərbəst davranışlar; **3.** səthi, tələsik, təcili; düşünülməmiş; **~ decision** səthi/tələsik qərar; **~ generalizations** səthi/tələsik ümumiləşdirmələr; **~ answer** tələsik/düşünülməmiş cavab; **4.** yumşaqxasiyyətli, üzüyola, mərhəmətli, iltifatlı; tez təsirə düşən; **a person with a ~ disposition** üzüyola/mərhəmətli/iltifatlı adam; **~ parents** yumşaqxasiyyətli/mərhəmətli valideynlər; **5.** bir işi asanlıqla görən; anadangəlmə; **a ~ liar** anadangəlmə yalançı; **a ~ writer** fitri/anadangəlmə yazıçı; **6.** *arx.* aydın, başadüşülən

**facilitate** [fəˈsɪlɪteɪt] *v* yüngülləşdirmək, kömək etmək, imkan yaratmaq, yol vermək, səbəb olmaq; **to ~ the execution of a task** tapşırığın yerinə yetirilməsini yüngülləşdirmək; **to ~ economic recovery** iqtisadiyyatın bərpasına/dirçəlməsinə imkan yaratmaq; *Modern inventions facilitate housework Müasir kəşflər ev işlərini asanlaşdırır*

**facilitation** [fə.sɪlɪˈteɪʃn] *n* yüngülləşdirmə, yüngülləşdirilmə, asanlaşdırma, asanlaşdırılma

**facility** [fəˈsɪlɪtɪ] *n* **1.** yüngüllük, asanlıq; sadəlik; **the ~ of the task** tapşırığın yüngüllüyü/asanlığı; **2.** qabiliyyət, istedad, zehin, bacarıq; çeviklik, zirəklik; **to have great ~ in learning languages** dilləri öyrənməkdə yaxşı qabiliyyətə malik olmaq; **3.** rəvanlıq, səlislik *(nitq haq.);* **to speak with ~** rəvan danışmaq; **4.** bacarıq, qabiliyyət, məharət, zirəklik, çeviklik, asanlıq; *He showed marvellous facility in playing difficult music O, çətin musiqini çalmaqda heyrətamiz məharət nümayiş etdirdi;* **to write letters with ~** hərfləri məharətlə yazmaq; **5.** *pl* rahatlıq, xidmət vasitələri; **good transportation facilities** yaxşı nəqliyyat vasitələri; **6.** imkan, əlverişli şərait; güzəşt, imtiyaz; *My way of life offers no facilities for study Oxumaq üçün mənim əlverişli şəraitim yoxdur;* **facilities for research** tədqiqat üçün əlverişli şərait; **7.** *pl* avadanlıq, təchizat, ləvazimat; vasitə; mexanizm, maşın, qurğu; **athletic facilities** idman qurğuları; **lighting facilities** işıqlandırıcı qurğular

**facing** [ˈfeɪsɪŋ] *n* **1.** üz; üzlük, üz çəkmə/ çəkilmə; **the stone facing of a building** binanın daş üzlüyü; **2.** yonma, yonulma, taraşlama, taraşlanma *(səth haq.);* **3.** bayır tərəfdən örtmə, bayır tərəfdən qat/lay; **a brick wall with a ~ of stone** daşdan üz çəkilmiş kərpic divar; **4.** bəzək, naxış *(paltarda və s.);* **a black dress with red silk ~** qırmızı ipək naxışlı qara paltar/geyim; **5.** köbə, haşiyə, köbə qoyma *(paltarda və s.);* **6.** *pl* hərbi mundirlərdə rəngli nişan/ kant / haşiyə və s.;

◊ **to go through** *one's* **~s** yoxlamadan/ sınaqdan keçmək; **to put** *smb.* **through his ~s** bir kəsin işə yaramasını/yararlılığını yoxlamaq

**facing distance** [ˈfeɪsɪŋˈdɪstns] *n hərb.* sıralar arasında məsafə

**facing stone** [ˈfeɪsɪŋstoun] *n* **1.** üzlük daş; **2.** bülöv, bülöv daşı

**facsimile¹** [fækˈsɪmɪlɪ] *n* **1.** faksimile *(əlyazması, imza, şəkil və ya sənədin eynilə çıxardılmış surəti);* **in ~** faksimile şəklində; **2.** faks; **to send a letter by ~** faksla məktub göndərmək

**fact** [fækt] *n* **1.** fakt, dəlil; hadisə, qəziyyə; vəziyyət, şərait; **dry ~s** quru faktlar; **stark ~s** təbii/dürüst faktlar; **established ~** müəyyən edilmiş fakt; **fixed ~** qəti müəyyənləşdirilmiş fakt; **salient ~s** əsas faktlar; **accomplished ~** olmuş/baş vermiş hadisə; **a certain physical ~** müəyyən fiziki hadisə; **~s of life** həyati faktlar,

həyat həqiqətləri; *The facts are as follows Faktlar aşağıdakı kimidir;* 2. həqiqət; reallıq, gerçəklik; **to look ~s in the face** faktların üzünə düz baxmaq; *But this is a fact Bu ki faktdır!; I know it for a fact Mən bilirəm ki, bu doğrudur; Is this a fact or is it just your opinion? Bu həqiqətən faktdır, yoxsa sənin/sizin fikrindir/ fikrinizdir?* 3. *pl* məlumat, dəlil, sübut, əsas; *His facts are false Onun dəlilləri yalandır; I dispute all your facts Mən sənin/sizin bütün faktlarını/faktlarınızı inkar edirəm;*

◊ **in ~, as a matter of ~, in point of ~** həqiqətən, həqiqətdə, əslində; *The fact is that... Məsələ belədir ki,...; Facts are stubborn things Faktları heç bir şey dəyişə bilməz;* **in spite of the ~ that...** baxmayaraq ki,...

**fact-find** [ˈfæktfaınd] *v* yoxlamaq, araşdırmaq, öyrənmək, təhqiq etmək *(vəziyyəti)*; faktları müəyyən etmək

**fact-finding**[1] [ˈfækt.faındıŋ] *n* yoxlama, yoxlanma, araşdırma, araşdırılma, təhqiq etmə/edilmə; faktları müəyyənləşdirmə; təfsilata varma

**fact-finding**[2] [ˈfækt.faındıŋ] *adj* araşdırma/ yoxlama aparan; **~ organ / committee** araşdırma aparan orqan /komissiya

**faction** [ˈfækʃn] *n* 1. *siya.* fraksiya *(parlament və ya ictimai təşkilatda hər hansı bir partiya üzvlərinin mütəşəkkil dəstəsi və ya partiya daxilində ayrılmış qrup)*; dəstə, güruh, kampaniya; 2. fraksiyaçılıq; fikir ayrılığı, çəkişmə, ixtilaf, ədavət; *They're in great faction themselves Onların arasında böyük ixtilaf/fikir ayrılığı var*

**factional** [ˈfækʃnl] *adj* fraksiyaçı, fraksiyaçılıq; **~ groups** fraksiyaçı qruplar; **~ disputes** fraksiyaçılıq mübahisələri

**factionalism** [ˈfækʃnəlızm] *n* fraksiyaçılıq

**factionalist** [ˈfækʃnəlıst] *n* fraksiyaçı

**factionary**[1] [ˈfækʃənrı] *n* 1. fraksiya üzvü; fraksiyaçı; 2. *arx.* növbətçi, qarovul, keşikçi, müdafiəçi, qoruyucu

**factionary**[2] [ˈfækʃənrı] *adj* fraksiyaçı

**factioneer** [ˈfækʃəˈnıəʳ] *n* = **factionist**

**factionist** [ˈfækʃnıst] *n* fraksiyaçı

**factious** [ˈfækʃəs] *adj* 1. fraksiyaçı; 2. təfriqəçilik, təfriqəçi; **~ activity** təfriqəçilik fəaliyyəti

**factitious** [fækˈtıʃəs] *adj* 1. süni; süni yaradılmış; **~ mound** süni yaradılmış qum/ torpaq təpəsi, süni kurqan *(qədim qəbirlər üzərində)*; təpə; 2. saxta; şərti; **~ enthusiasm** saxta ruh yüksəkliyi

**factor**[1] [ˈfæktəʳ] *n* 1. amil, səbəb, hərəkətverici qüvvə; **the main ~ in this process** bu prosesdə əsas səbəb; *Soil and climate are two key factors that affect vegetation growth Torpaq və iqlim bitkilərin inkişafı üçün iki başlıca amildir /faktordur; The result will depend on a number of different factors Nəticə bir sıra faktorlardan/ səbəblərdən asılı olacaq;* 2. agent, nümayəndə; 3. komisyoner, komisyonçu *(ticarət işlərində müəyyən faiz almaq şərtilə vasitəçilik edən şəxs)*, vasitəçi, etibarlı şəxs, agent; 4. *riyaz.* vuran *(ədəd)*; 5. əmsal; **~ of safety** təhlükəsizlik əmsalı; 6. *biol.* gen; 7. *biol.* vitamin; 8. hormon *(daxili sekresiya vəzilərinin qana buraxdığı maddə)*

**factor**[2] [ˈfæktəʳ] *v* 1. vasitəçi/agent kimi çıxış etmək; **to ~ an estate** mülkü/malikanəni idarə etmək; 2. *riyaz.* vurana ayırmaq

**factory**[1] [ˈfæktərı] *n* 1. fabrik, zavod; **a car ~** maşın zavodu; 2. faktoriya *(Avropa tacirlərinin müstəmləkələrdə təşkil etdikləri ticarət məntəqəsi)*

**factory**[2] [ˈfæktərı] *adj* fabrik, zavod; **~ law** fabrik qanunu; **~ committee** fabrik-zavod komitəsi; **~ test** zavod təcrübəsi/testi; **~ waste** sənaye tullantıları

**factory accident** [ˈfæktrı.æksıdnt] *n* istehsalatda bədbəxt hadisə; istehsalat travması *(xarici təsir, yəni yara, əzilmə və s. nəticəsində bədən toxumalarının zədələnməsi)*

**factory-built** [ˈfæktrıbılt] *adj* zavod tərəfindən hazırlanmış/hazırlanan

**factory-buster** [ˈfæktrı.bʌstəʳ] *n harb.* ağır partlayıcı bomba

**factory-ship** [ˈfæktrıʃıp] *n* üzən balıq zavodu *(balıq konservi hazırlayan/balıq duzlayan zavod)*

**factual** [ˈfæktʃuəl] *adj* 1. faktiki, faktiki olaraq, faktlarla bağlı; **~ report** faktların şərhi / şərh edilməsi; **to give a ~ account of events** hadisələr haqqında fakta əsaslanan hesabat vermək; 2. həqiqi, əsl, faktiki olaraq mövcud olan, real; **~ data** həqiqi/faktiki rəqəmlər

**facture** [ˈfæktʃəʳ] *n* 1. faktura *(incəsənət əsərlərində bədii yaradıcılıq üsulu)*; 2. *tic.* faktura *(buraxılan və ya yola salınan malların siyahısı)*; 3. qayırma, qayrılma; istehsal etmə/edilmə; hazırlama, hazırlanma, istehsal; 4. hazırlama qaydası/üsulu

**facultative** [ˈfækltətıv] *adj* 1. fakultativ, könüllü, qeyri-məcburi; **~ studies** fakultativ məşğələlər; 2. təsadüfi, gözlənilməyən, sistematik /müntəzəm/daimi/məcburi/vacib olmayan

**facultatively** [ˈfækltətıvlı] *adv* 1. fakultativ, könüllü olaraq, məcburi olmadan; 2. təsadüfən, təsadüfi, təsadüfi olaraq; bilmədən

**faculty** [ˈfækltı] *n* I 1. qabiliyyət, istedad, bacarıq, zəka, vergi; **~ of speech** nitq qabiliyyəti; **the mental faculties** əqli qabiliyyətlər; **the ~ of making friends** dost qazanmaq bacarığı/qabiliyyəti; **~ for saying the right thing** həmişə yerli-yerində danışmaq bacarığı; **to collect *one's* faculties** özünü ələ almaq, özünə gəlmək; **to be in possession of all *one's* faculties** özünün bütün əqli və fiziki qabiliyyətini saxlamaq; **to have a great ~ for mathematics** riyaziyyata böyük qabiliyyəti olmaq, riyaziyyatı



çox asanlıqla öyrənmək bacarığına malik olmaq; 2. hakimiyyət, hüquq *(əsas. kilsədə)*

**faculty** [ˈfæklтı] *n* II 1. fakültə, şöbə; **the ~ of law/of medicine** hüquq/tibb fakültəsi; **the four ~ies** ilahiyyat /hüquq /tibb və humanitar elmlər şöbəsi; 2. professor-müəllim heyəti; 3. *top.* i eyni sənətə aid olan ali təhsilli şəxslər, eyni sənət sahibləri; **the medical ~** həkimlər; **the legal ~** hüquqşünaslar

**fad** [fæd] *n* qəribəlik, şıltaqlıq; ədabazlıq; **to be full of ~s** bir aləm şıltaqlığı/qəribəliyi/ədabazlığı olmaq; *It's a fad with him Bu onun qəribəliyidir/ədabazlığıdır*

**fade**[1] [feıd] *adj* 1. şirin; 2. *məc.* duzsuz, şit; adi, bayağı; 3. *arx.* solğun, sönük, cansız, çox zəif

**fade**[2] [feıd] *v* 1. solmaq, saralıb solmaq, soluxmaq; təravətini itirmək; *The flowers have faded Güllər solub/soluxub; Beauty fades Gözəllik solur;* 2. ağarmaq, bozarmaq *(parça haq.)*, rəngi qaçmaq, solmaq, saralmaq *(boya, rəng haq.)*; *Guaranteed not to fade Solmur; My socks faded in the wash Corablarım yuyulanda soldu;* 3. zəifləşdirmək, solğunlaşdırmaq, soldurmaq *(bir şeyin rəngini)*; *The sun has faded the curtains/wall-papers Günəş pərdələri/divar kağızlarını soldurub;* 4. tədricən yavaşımaq/ kəsilmək *(səs haq.)*; *The music faded in the distance Musiqi sədaları uzaqda kəsildi;* 5. tədricən yox olmaq, itmək, gözdən itmək, aradan qalxmaq, silinmək, yox olub/silinib getmək; *The coast faded from sight Sahil tədricən gözdən itdi; Summer fades into autumn Yay yavaş-yavaş payıza keçir; All memory of their friendship has faded Onların dostluq haqqında olan bütün xatirələri yavaş-yavaş yox olub getdi;*

◊ **~ away** *(tədricən)* yox olmaq, yox olub getmək, sönüb getmək; *She was fading away Onun həyatı tədricən sönürdü;* **~ in** tədricən güclənmək *(səs haq.)*; **~ out** 1) zəifləşmək, zəifləmək, gücdən düşmək *(səs haq.)*; 2) yox olmaq *(təsvir haq.)*

**fadeaway** [ˈfeıdəˈweı] *n amer.* tədricən yox olma, itmə, gözdən itmə

**faded** [ˈfeıdıd] *adj* solmuş, rəngi solmuş/ qaçmış, solğun, saralmış, ağarmış, bozarmış; **~ curtains** solmuş/bozarmış pərdələr; **~ cheeks** solmuş yanaqlar; **~ photograph** saralmış foto/şəkil

**fadeless** [ˈfeıdlıs] *adj* solmayan; unudulmaz, unudulmayan, əbədi; **~ glory** unudulmaz/ əbədi şöhrət; **~ memories of childhood** uşaqlığın unudulmaz xatirələri

**fail**[1] [feıl] *n* 1. müvəffəqiyyətsizlik, uğursuzluq, iflas, müvəffəqiyyətsizliyə/iflasa uğrama; 2. imtahanda pis qiymət alma/ kəsilmə;

◊ **without ~** hökmən, mütləq; şübhəsiz, yəqin; *I'll come without fail Mən mütləq / hökmən gələcəm*

**fail**[2] [feıl] *v* I 1. uğursuzluğa/müvəffəqiyyətsizliyə uğramaq; **to ~ in life** həyatda uğursuzluğa uğramaq; **to ~ in a suit** *hüq.* məhkəmə işini uduzmaq; 2. baş tutmamaq, boşa çıxmaq, həyata keçməmək; *All our plans failed Bizim bütün planlarımız puça çıxdı; His attempt has failed Onun təşəbbüsü / cəhdi baş tutmadı;* **to ~ the height** *id.* hündürlüyü dəf edə bilməmək *(yüngül atletika)*; 3. aldatmaq, pis vəziyyətə qoymaq, ümidi doğrultmamaq; *As usual he failed me at the last minute Adəti üzrə o, son dəqiqədə mənim ümidimi doğrultmadı;* 4. az olmaq, çatmamaq, kifayət etməmək; *Time would fail me Vaxtım olmayacaq/ çatmayacaq;* 5. kəsir/çətinlik hiss etmək *(bir şeydə)*; *I fail words to express my thanks Minnətdarlığımı ifadə etmək üçün söz tapmaqda çətinlik çəkirəm;* 6. azalmaq, qurtarmaq, tükənmək; *Our water supply has failed Bizim su ehtiyatımız qurtarıb;* 7. zəifləmək, zəifləşmək, gücdən düşmək; *The wind failed Külək zəiflədi; The light failed İşıq zəiflədi; His sight is failing Onun görmə qabiliyyəti zəifləyir;* 8. kəsilmək, qurtarmaq, bitmək, dayanmaq, durmaq, sona çatmaq; qırılıb qurtarmaq, nəsli kəsilmək; *Their family line failed Onların nəsli kəsildi;* 9. işləməmək, sıradan çıxmaq, dayanmaq; *The engine failed unexpectedly Motor/Mühərrik gözlənilmədən dayandı; The patient's heart failed Xəstənin ürəyi dayandı*

**fail** [feıl] *v* II 1. pis qiymət almaq, kəsilmək *(imtahanda)*; *He failed in History O, tarixdən kəsildi/pis qiymət aldı; She failed her driving test O, sürücülük vəsiqəsini almaq üçün imtahan verə bilmədi;* 2. az olmaq *(məhsul haq.)*; *The potato crop failed this year Bu il kartof məhsulu az oldu;* 3. iflasa uğramaq, müflisləşmək *(firma və s. haq.)*; **to ~ to do *smth.*** bir şeyi etməyi bacarmamaq, bir şeyi etməkdə bacarıqsız/aciz olmaq; *We failed to arrive in time Biz vaxtında gələ bilmədik; They failed to understand me Onlar məni başa düşə bilmədilər;* 4. bir şeyi etməmək /yadından çıxartmaq, unutmaq; *The girl failed to remember his name Qız onun adını yadına sala bilmədi; Don't fail to let me know Mənə xəbər verməyi unutma/unutmayın!* 5.: **to ~ in *smth.*** bir şeydən kəsiri olmaq; **to ~ in beauty** çirkin/kifir olmaq; **to ~ in respect for *smb.*** kiməsə hörmət etməmək; *His visit had failed of its purpose Onun səfəri qarşıya qoyulan məqsədə nail olmadı, Onun səfəri uğursuz oldu*

**failed** [ˈfeıld] *adj* 1. uğursuz, baş tutmayan; **~ try** *id.* uğursuz səy/cəhd; 2. müflisləşmiş; **~ firm** müflisləşmiş firma

**failing**[1] [ˈfeılıŋ] *n* 1. səhv; zəiflik, zəif cəhət; 2. *məc.* nöqsan, qüsur; *We all have our failings Bizim hamımızın nöqsanımız /qüsurumuz var;* 3. müvəffəqiyyətsizlik, uğursuzluq; iflas, uğursuzluğa / müvəffəqiyyətsizliyə uğrama

**failing**[2] [ˈfeılıŋ] *adj* 1. çatmayan, çatışmayan, ki-

fayət etməyən, əskik olan; 2. zəifləyən; ~ **sight** zəifləyən görmə qabiliyyəti

**failing³** [ˈfeılıŋ] *prep* ...olmadığına görə; ...olmadığı üçün; ...olmasa, ...sa/sə; *Failing his arrival we shall stay here Əgər o gəlməsə, biz burada qalacağıq; Failing a purchaser, he let the house Alıcı olmadığı üçün o, evi icarəyə verdi*

**fail-safe** [ˈfeılseıf] *adj tex.* 1. etibarlı, möhkəm; 2. səhvsiz işləyən; arasıkəsilməz, fasiləsiz, müntəzəm

**failure** [ˈfeıljəʳ] *n* 1. müvəffəqiyyətsizlik, uğursuzluq, iflas, müvəffəqiyyətsizliyə/ iflasa uğrama; **dead** ~ tam uğursuzluq; **bitter** ~ acı uğursuzluq; **to end in** ~ müvəffəqiyyətsizliklə başa çatmaq; *All his efforts ended in failure Onun bütün səyləri/cəhdləri boşa çıxdı/müvəffəqiyyətsizliyə uğradı;* **to meet with** ~ müvəffəqiyyətsizliyə uğramaq; 2. kəsilmə *(imtahanda), d.d.* pis qiymət alma *(imtahanda);* 3. çatışmama; yoxluq, olmama; ~ **of rain** yağışın olmaması; 4. uğursuz/bəxtsiz /işi gətirməyən adam; *He was a failure in art O, incəsənətdə uğur qazana bilmədi;* 5. baş tutmayan iş; *His invention turned out (to be) a failure Onun ixtirası qəbul edilmədi; The play was a failure Tamaşa müvəffəqiyyətsizliyə uğradı;* 6. yerinə yetirməmə, həyata keçirilməmə; ~ **to keep a promise** vədi pozma, vədə xilaf çıxma; 7. səhv, səhv iş; diqqətsizlik, gözdən qaçırma; *They made a failure of keeping watch Onlar vaxtı nəzərdən qaçırdılar;* 8. müflislik, bankrot, iflas; ödəmələri dayandırma; **numerous bank** ~**s** saysız-hesabsız / çoxlu bank iflası; 9. *tex.* avariya, qəza; fasilə, arasıkəsilmə; işləməmə; *There was a failure of electricity Elektrik xəttində qəza baş verdi;* ~ **of a pump** nasosun korlanması /işləməməsi

**fain** [feın] *adj* 1. məcbur edilmiş/olmuş; *He was fain to comply with their demands O onların tələbləri ilə razılaşmağa məcbur oldu; She was fain to keep silence O susmağa məcbur oldu;* 2. *arx. şair.* həvəsli, meylli, mail, hazır *(bir şey etmək üçün)*

**faint¹** [feınt] *n* özündən getmə, ürəyi getmə, huşunu itirmə, qəşş etmə, bihuş olma; **a dead** ~ huşunu tam itirmə; **to be in a** ~ huşunu itirmək, ürəyi getmək; qəşş etmək; **to fall down in a (dead)** ~ huşunu tam itirib yıxılmaq; *She fell to the ground in a (dead) faint O, huşunu (tam) itirib yerə yıxıldı*

**faint²** [feınt] *adj* (**-er, -est**) 1. zəif; **a** ~ **sound /glow** zəif səs/parıltı; **a** ~ **smell of perfume** ətrin zəif iyi/rayihəsi; **a** ~ **resemblance** zəif oxşarlıq/oxşayış; **to feel** ~ zəiflik hiss etmək; **to be** ~ zəifləmək; *The explorers were faint from hunger and cold Tədqiqatçılar aclıqdan və soyuqdan zəifləmişdilər;* 2. solğun; dumanlı, aydın olmayan; ~ **colour** solğun rəng; **to have a** ~ **idea of** *smth.* bir şey haqqında dumanlı təsəvvürü olmaq

**faint³** [feınt] *v* 1. zəifləmək *(yorğunluqdan, aclıqdan və s.);* 2. ürəyi getmək, huşunu itirmək; *He fainted from hunger O, aclıqdan huşunu itirdi;* 3. *arx. şair.* cəsarətini itirmək, ruhdan düşmək; 4. tutqunlaşmaq, qaralmaq, solmaq, saralmaq, ağarmaq *(rəng və s. haq.)*

**faint-heart¹** [ˈfeıntha:t] *n* qorxaq/ürəksiz/ cəsarətsiz/ ağciyər adam

**faint-heart²** [ˈfeıntha:t] *adj* ürəksiz, qorxaq, cəsarətsiz, ağciyər

**faint-hearted** [ˈfeıntˈha:tıd] *adj* qorxaq, qorxacaq, ürəksiz, cəsarətsiz, ağciyər; iradəsiz, zəif iradəli, iradəsi zəif, qətiyyətsiz, aciz

**faint-heartedly** [ˈfeıntˈha:tıdlı] *adv* ürəksiz, qorxaqcasına, cəsarətsiz, qorxa-qorxa, çəkinə-çəkinə, tərəddüdlə

**faint-heartedness** [ˈfeıntˈha:tıdnıs] *n* ürəksizlik, ağciyərlik, qorxaqlıq, cəsarətsizlik

**faintly** [ˈfeıntlı] *adj* solğun, sönük, zəif; çətinliklə, güclə, zorla; ~ **visible** çətinliklə / güclə görünən; *She sighed faintly O yavaşca ah çəkdi*

**faintness** [ˈfeıntnıs] *n* 1. zəiflik, gücsüzlük, cansızlıq; 2. ürək bulanması; ürəyibulanma, ürəyi xarab olma; 3. solğunluq; 4. ürəksizlik, ağciyərlik, qorxaqlıq, cəsarətsizlik

**fair¹** [feəʳ] *n* I 1. yarmarka *(vaxtaşırı təşkil edilən ticarət bazarı);* **the Leipzig Spring Fair** Yaz Leypsiq Yarmarkası; 2. xeyriyyəçilik bazarı; **church** ~ kilsə/xeyriyyəçilik bazarı; 3. sərgi; **World Fair** Ümumdünya Sərgisi

**fair** [feəʳ] *n* II *arx. şair.* 1. gözəl qız / qadın, göyçək qız / qadın, dilbər; sevgili, canan; **the** ~ *top. i* qadınlar; 2. qadın;

◊ **for** ~ *amer.* həqiqətən, həqiqətdə, doğrudan da, şübhəsiz, əlbəttə

**fair²** [feəʳ] *adj* 1. düz, təmiz, doğru; haqlı, dürüst, qanuni, qərəzsiz, ədalətli; **by** ~ **means** düz yolla; ~ **deal** təmiz saziş/sövdə; ~ **play** təmiz/vicdanlı oyun; ~ **price** ədalətli/insaflı qiymət; **strict but** ~ ciddi, lakin ədalətli; **in** ~ **condition** əlverişli şəraitdə; **a** ~ **number** kifayət qədər say/ miqdar; **house of** ~ **size** yetərincə böyük ölçülü ev; 2. adi, orta, babat, orta səviyyəli; *It's only a fair movie Bu olduqca adi/orta səviyyəli filmdir;* 3. sarışın, sarısaçlı; açıq, açıq rəngli; ~ **hair** sarışın saç; ~ **skin** açıq rəngli dəri; ~ **woman** sarıyanız/sarışın/sarıyağız/sarısaç qadın; 4. təmiz, ləkələnməmiş, ləkəsiz; ~ **name** təmiz/ləkəsiz ad; 5. aydın və günəşli; ~ **weather** aydın və günəşli hava; ~ **sky** aydın səma; 6. aydın/asan oxunan; ~ **writing/hand** aydın/asan oxunan xətt/yazı; 7. *arx. şair.* gözəl, çox gözəl, çox qəşəng; ~ **woman** çox gözəl/göyçək qadın; dilbər; **the** ~ **sex** *top. i* qadınlar;

◊ **Fair enough** Ədalətlidir, Razıyam; ~ **without, false within** ≅ üstü bəzək, altı təzək; *It's a fair swindle Bu tamam fırıldaqdır*

**fair³** [feəʳ] *adv* 1. namusla, şərəflə, vicdanla; düz,



doğru; **to play** ~ namusla/vicdanla /qayda ilə oynamaq; **to hit** ~ *id.* qayda ilə zərbə endirmək; 2. düz; **to strike** *smb.* ~ **on the chin** bir kəsin düz çənəsinə vurmaq

**fair-copy¹** [ˈfeəˌkɔpı] *n* üzü ağardılmış əlyazması/nüsxə

**fair-copy²** [ˈfeəˌkɔpı] *v* üzünü köçürmək, təmiz yazmaq

**fair-dealing¹** [ˈfeəˌdi:lıŋ] *n* düzlük, təmizlik, doğruluq, namus, vicdan, sədaqət, səmimiyyət, açıqlıq, saflıq, açıqürəklilik, səmimilik

**fair-dealing²** [ˈfeəˌdi:lıŋ] *adj* düz, təmiz, doğru, vicdanlı, namuslu, səmimi, ürəyiaçıq, saf

**fair-faced** [ˈfeəfeıst] *adj* 1. gözəl, göyçək; ağüzlü; 2. açıq sifətli/üzlü; 3. xoşgörkəm, xoşgörkəmli, sevimli, qəşəng

**fair-haired** [ˈfeəheəd] *adj* 1. sarışın saçlı; 2. *amer. d.d.* sevimli, istəkli, sevilən, əziz; **the** ~ **boy of the family** ailənin sevimli/ istəkli oğlu

**fairly** [ˈfeəlı] *adv* 1. namusla, şərəflə, vicdanla; düz, doğru; ədalətlə, düzgün, qanuna uyğun olaraq, qərəzsiz olaraq, üzgörmədən, insafla, bitərəfanə; **to win / to gain** *smth.* ~ bir şeyi vicdanla/ədalətlə almaq/əldə etmək; **to act** ~ **by all men** bütün adamlara qarşı ədalətli olmaq; 2. xeyli, olduqca, çox, dedikcə; ~ **good** olduqca yaxşı; *She sings fairly well O çox yaxşı oxuyur; He is fairly beside himself O heç özündə deyil;* **in** ~ **close relations** çox yaxın münasibətdə; 3. aydın, açıq; **to write** ~ aydın /açıq yazmaq

**fair-minded** [ˈfeəˈmaındıd] *adj* insaflı, ədalətli, adil, haqlı, doğru, qərəzsiz, bitərəf

**fair-trade¹** [ˌfeəˈtreıd] *n* qanuni ticarət; 2. qarşılıqlı ticarət *(eyni qaydaya əsaslanan)*

**fair-trade²** [ˌfeəˈtreıd] *adj* qarşılıqlı ticarət; ~ **agreement** qarşılıqlı ticarət müqaviləsi

**fairy¹** [ˈfeərı] *n* pəri; cadugər, sehrbaz qadın /qız; ~ **of the mine** kobold *(alman əfsanələrində cin);* cin, cırtdan *(Qərbi Avropa nağıllarında);* **bad** ~ qəddar pəri; şər adam, şərçi

**fairy²** [ˈfeərı] *adj* 1. sehrli, cadulu, tilsimli; 2. füsunkar, məftunedici, qəşəng; əfsanəvi, misli görünməmiş, fövqəladə; 3. göz qabağına gətirilən, xəyali; təsəvvür edilən

**fairyland** [ˈfeərılænd] *n* əfsanəvi/xəyali ölkə

**fairy-mushroom** [ˈfeərımʌʃrum] *n* zəhərli göbələk

**fairy-tale** [ˈfeərıteıl] *n* 1. sehrli nağıl; 2. *pl d.d.* uydurma, yalan, yalan-palan, əfsanə

**faith** [feıθ] *n* 1. inam, etibar, etimad; **to have** ~ **in** *smth.* bir şeyə inanmaq; **to pin** *one's* ~ **on / to** *smth.*, **to place** *one's* ~ **in** *smth.* bir şeyə korkoranə inanmaq; **to shake** *smb.'s* ~ bir kəsin inamını sarsıtmaq; 2. *din.* iman, məzhəb; **the Christian** ~ xristianlıq, xristian dini/məzhəbi, xaçpərəstlik; **the Mohammedan** ~ müsəlmanlıq, islam dini/məzhəbi; 3. kredo, məslək, əqidə, etiqad, baxışlar; **political** ~ siyasi kredo; **to keep** *one's* ~ öz məsləkinə / əqidəsinə əməl etmək; **to break** *one's* ~ öz əqidəsindən əl çəkmək/götürmək; 4. vəfa, doğruluq; düzlük; namus, vicdan, sədaqət, səmimiyyət; loyallıq *(qanun dairəsində hərəkət etmə, qanuna müvafiqlik, loyal münasibət);* **good** ~ vicdan, insaf, düzlük; sədaqət, vəfa, doğruluq; **in good** ~ namusla, şərəflə, vicdanla; düz, doğru, təmiz, səmimi olaraq, açıq ürəklə; insafla; **bad** ~ vicdansızlıq, insafsızlıq, alçaqlıq, namussuzluq, şərəfsizlik, sədaqətsizlik, vəfasızlıq, namərdlik, xəyanət; **in bad** ~ xaincəsinə, vəfasızcasına, vəfasızlıqla, namərdcəsinə, əhdini pozaraq, xaincəsinə, satqıncasına; 5. vəd, vəd etmə, söz vermə, zəmanət, zaminlik; **to give/to pledge/to plight** *one's* ~ söz vermək; **breach of** ~ vədini pozma; şərəfsiz hərəkət;

◊ *Upon/By my faith!, In faith! Vicdanıma and içirəm!, Vicdanım haqqı!*

**faithful** [ˈfeıθfl] *adj* 1. sadiq, vəfalı, sədaqətli; ~ **friend** sədaqətli / vəfalı dost; ~ **husband** vəfalı ər; **to be** ~ **to** *one's* **promise** vədinə sadiq olmaq; 2. doğru, düzgün, gerçək, dürüst, səhih, etibarlı, mötəbər; ~ **narrative** gerçək hekayə; **to give a** ~ **account of the course of events** hadisələr haqqında düzgün hesabat vermək; 3. vicdanlı, insaflı, namuslu, düz; **the** ~ *top. i* inananlar, etiqad edənlər *(xüs. dinə, siyasətə)*

**faithfully** [ˈfeıθfəlı] *adv* 1. sədaqətlə, vicdanla; **to serve** *smb.* ~ bir kəsə sədaqətlə /vicdanla xidmət etmək; *The old nurse had served the family faithfully for thirty years Qoca dayə ailəyə otuz il vicdanla/ sədaqətlə xidmət etdi;* 2. dürüst, düz, dümdüz; **to reproduce** *smth.* ~ dəqiq təkrar etmək *(bütün xırdalığı ilə);*

◊ **yours** ~ hörmət və ehtiramla *(məktubun axırında yazılan ifadə)*

**faithfulness** [ˈfeıθfəlnıs] *n* 1. sədaqət, vəfa, doğruluq, loyallıq; ~ **to tradition** ənənəyə/adətə sədaqət; 2. gerçəklik, etibarlılıq, mötəbərlik, səhihlik, yəqinlik; 3. düzlük, təmizlik, namus, vicdan, sədaqət, səmimiyyət

**faithless** [ˈfeıθlıs] *adj* 1. xain, xəyanətkar, vəfasız, namərd; **a** ~ **friend** vəfasız/namərd dost; **a** ~ **wife** vəfasız/xəyanətkar arvad; 2. etimada layiq olmayan; etibarsız; yəqin olmayan, şübhəli; **a man of** ~ **disposition** etibarsız adam; 3. dinə inanmayan; ateist, dinsiz, kafir, mürtəd

**faithworthy** [ˈfeıθˌwə:ðı] *adj* etibara/etibar etməyə layiq

**fake¹** [feık] *n* 1. *d.d.* saxtakarlıq; aldatma; saxta *(sənəd, kağız);* 2. kələkbazlıq, biclik, hiyləgərlik, fırıldaqçılıq, adam aldatma, dələduzluq; 3. fırıldaqçı / hiyləgər/ adamaldadan/dələduz adam

**fake²** [feık] *v* 1. saxtalaşdırmaq, saxtasını düzəltmək, saxtakarlıq etmək; **to** ~ **result** nəticəni saxtalaşdırmaq; 2. fırıldaqçılıq/ hiyləgərlik etmək, adam aldatmaq, dələduzluq etmək, ələ salmaq, oynatmaq, araya/lağa qoymaq; 3. *id.*

fənd etmək *(rəqibi yayındırmaq üçün)*; 4. *jarq.* soymaq, qarət etmək; talamaq

**faked** [feɪkt] *adj* saxta, qəlp, qondarma, süni; saxtalaşdırılmış; ~ **diamonds** saxta brilyantlar; ~ **report** qondarma hesabat

**faker** [ˈfeɪkəʳ] *n* 1. yalançı, adamaldadan; saxtakar, saxtakarlıqla məşğul olan adam; fırıldaqçı, hiyləgər, dələduz; riyakar; 2. oğru, kələkbaz, lotu; 3. çərçi, səyyar satıcı; küçə alverçisi

**fakir** [ˈfa:kɪəʳ] *n* dərviş; sehrbaz, gözbağlayıcı

**fall¹** [fɔ:l] *n* 1. yıxılma, düşmə; **a ~ from *one's* horse** atından yıxılma; **the ~ of an apple** almanın düşməsi; **the ~ of the hammer** çəkicin zərbəsi/enməsi *(auksionda)*; **pin ~** hər iki kürəyi üstə yıxılma *(güləşdə)*; **to have a ~** yıxılmaq; 2. *məc.* süqut, son, axır; **the rise and ~ of the Roman Empire** Roma imperiyasının yüksəlişi və süqutu; 3. enmə, aşağı düşmə, azalma; ~ **in temperature** temperaturun aşağı düşməsi; 4. *pl* şəlalə; **the ~s of Niagara** Niaqara şəlaləsi; 5. tökülmə *(saç, diş haq.)*; 6. yağıntı, yağmur; **a heavy ~ of rain** güclü yağış/yağmur, leysan; 7. *amer.* payız, xəzan;

◊ **to be at ~** *arx.* ağır vəziyyətdə olmaq; **to ride for a ~** ehtiyatsız hərəkət etmək

**fall²** [fɔ:l] *v* (*pt* **fell** [fel], *pp* **fallen** [ˈfɔ:ln]) 1. yıxılmaq; **to ~ to the ground** yerə yıxılmaq; **to ~ out of a window** pəncərədən yıxılmaq; **to ~ downstairs** pilləkəndən yıxılmaq; 2. əyilmək, enmək; *The girl's head fell on the boy's shoulder Qızın başı oğlanın çiyninə əyildi;* 3. düşmək, çatmaq, gəlmək, yaxınlaşmaq; *Darkness fell Qaranlıq düşdü; Night is falling fast Gecə sürətlə düşür; The temperature fell Temperatur düşdü; The prices have fallen Qiymətlər düşüb; The market is falling Bazarda qiymətlər düşür;* 4. əldən salmaq, üzmək, güc gəlmək; *Sleep fell upon them Yuxu onları əldən saldı; Fear fell upon them Qorxu onları əldən saldı;* 5. sakitləşmək, zəifləmək, azalmaq, kəsilmək; *The wind fell Külək sakitləşdi; His voice fell Onun səsi zəiflədi; The conversation fell for a few minutes Söhbət bir neçə dəqiqəlik kəsildi;* 6. pisləşmək, xarablaşmaq, ağırlaşmaq; korlanmaq, xarab olmaq, pozulmaq, zay olmaq; *My spirits fell Əhval-rühiyyəm/Ovqatım korlandı;* 7. ölmək, həlak/ tələf/məhv olmaq; qırılmaq; **to ~ in a battle** döyüşdə həlak olmaq; **to ~ by sword** qılınc yarasından ölmək; *Two elephants fell to his gun O, iki fil öldürdü; The fortress/The town fell Qala/Şəhər təslim oldu/ süqut etdi; The Cabinet fell Hökumət yıxıldı / devrildi;* **to ~ in *smb.'s* estimation** bir kəsin gözündən düşmək; 8. ölmək, murdar olmaq, gəbərmək, qırılmaq *(heyvan haq.)*; *Large number of cattle fell in the drought Quraqlıq vaxtı çoxlu mal-qara öldü/qırıldı;* 9. dönmək, dikilmək, çevrilmək, yönəlmək; *When his eyes fell on me... Onun gözləri mənə dikiləndə...; His eye fell on a misprint Onun gözünə mətbəə xətası çarpdı;* 10. uçulmaq, dağılmaq, sökülmək, tökülmək, çökmək, enmək, yatmaq; *Many houses fell in the earthquake Zəlzələ zamanı çoxlu evlər çökdü/uçuldu/dağıldı;* 11. **(on, upon)** düşmək; *The lot fell on him Püşk ona düşdü; The responsibility falls on me Məsuliyyət mənim üzərimə düşür; May Day this year falls on Monday Bu il May bayramı bazar ertəsinə düşür;* 12. **(to)** bəxtinə çıxmaq, payına düşmək *(bir kəsin)*; çıxmaq; qismət olmaq *(bir kəsə)*; **to ~ to *smb.'s* share/to *smb.'s* lot** bir kəsin payına düşmək; *It fell to me to break the news to her Bu xəbəri ona bildirmək mənim qismətimə düşdü;* 13. ağzından çıxmaq; *Not a word fell from his lips Ağzından bir söz belə çıxmadı; I agree with what has fallen from the last speaker Mən axırıncı natiqin dedikləri ilə razıyam;* 14. *jarq.* dustaqxanaya düşmək; *He fell twice O, iki dəfə dustaqxanaya düşdü;* 15. tökülmək *(yarpaq, diş, saç və s. haq.)*; *Blossoms fell from the trees Çiçəklər ağaclardan töküldü; A child's first teeth fall Uşağın süd dişləri tökülür; His hair is falling Onun saçları tökülür;* 16. tökülmək *(çay haq.)*; **rivers that ~ into the sea** dənizə tökülən çaylar; 17. düşmək *(tələyə və s.)*; **to ~ into a snare / a trap** tələyə düşmək; **to ~ into *smb.'s* clutches** bir kəsin cənginə keçmək; **to ~ a prey/a victim** qurban olmaq; **to ~ a prey to circumstances** şəraitin qurbanı olmaq; 18. dağılmaq, uçmaq, parçalanmaq, bölünmək *(hissələrə)*; **to ~ to/into pieces, to ~ apart/asunder** hissələrə parçalanmaq; *The work falls into three divisions İş üç hissəyə bölünür;* 19. gəlmək *(ağıla)*; *When this strange idea fell into his mind... Bu qəribə fikir onun ağlına gələndə...;* **to ~ across *smb/smth.*** üstünə çıxmaq, toqquşmaq, toxunmaq; **to ~ on/ upon *smb./smth.*** 1) bir kəsə/bir şeyə rast gəlmək, bir kəslə/bir şeylə rastlaşmaq; *She had fallen on hard times O, ağır/çətin vaxtla rastlaşmışdı;* 2) üstünə atılmaq/tullanmaq; **to ~ upon *smb.'s* neck** bir kəsin boynuna atılmaq; **to ~ in with *smb.*** bir kəslə rastlaşmaq, bir kəsə rast gəlmək; *On my way home I usually fall in with Smith Evə gedərkən mən adətən Smitə rast gəlirəm;* **to ~ in/with *smth.*** 1) bir şeyə uyğun olmaq/gəlmək; *It falls in exactly with my views Bu mənim baxışlarıma tamamilə uyğun gəlir;* 2) bir şeyə qoşulmaq; bir şeyi müdafiə etmək, bir şeyə tərəfdar olmaq; **to ~ in with a proposal** bir təklifə tərəfdar olmaq, bir təklifi müdafiə etmək; **to ~ among thieves** təsadüfən oğrular arasına düşmək; **to ~ under suspicion** şübhə altına duşmək; **to ~ under *smb.'s* power** bir kəsin təsiri altına düşmək; bir qrupa və s. daxil/aid olmaq; *These facts fall under another category Bu faktlar digər kateqoriyaya aiddir;* **to ~ in (to) a state** hər hansı bir vəziyyətə düşmək, hər hansı bir vəziyyətə çatmaq; **to ~ into a rage** qəzəblənmək, qeyzlənmək; **to ~ into error** səhv etmək; **to ~ in love** sevmək, vurulmaq, aşiq/bənd olmaq; **to ~ into disgrace/into disfavour** biabır olmaq, gözdən /etibardan düşmək; **to ~ to doing *smth.*** bir şey etməyə başlamaq; *One night I fell to thinking of the past Bir gecə keçmiş haqqında düşündüm;* **to ~ back (up) on *smth.*** bir şeyə əl atmaq/ müraciət etmək; **to ~ back upon lies** yalana əl atmaq; **to ~ back upon *smb.'s* help** bir kəsin köməyinə müraciət etmək; **to ~ down on *smth.*** *amer. d.d.* ümidi doğrultmamaq, müvəffəqiyyətsizliyə uğramaq; *He fell down on the job O, işin öhdəsindən gəlmədi;* **to ~ for *smb.*** *d.d.* bir kəsi sevmək, bir kəsə vurulmaq/ məftun olmaq, bir kəsə könül vermək; *Every girl falls for him Bütün qızlar ona vurulurlar / valeh olurlar;* **to ~ for *smth.*** *d.d.* aldanmaq, tovlanmaq, tora düşmək; *He at once fell for it O dərhal buna aldandı;* **to ~ asleep** yatmaq, yuxulamaq, yuxuya getmək; **to ~ sick** xəstələnmək; naxoşlamaq; **to ~ dumb** lal olmaq, dili tutulmaq; **to ~ silent** susmaq, səsini kəsmək;

◊ **to ~ away** 1) atmaq, üz döndərmək; *All his old friends fell away from him Onun bütün köhnə dostları onu atdılar/ ondan üz döndərdilər;* 2) dönmək *(etiqaddan, məsləkdən)*; 3) azalmaq, enmək, əskilmək, zəifləşmək, zəifləmək; *In London trade always falls away during the summer Londonda ticarət həmişə yayda zəifləyir;* **to ~ back** geri çəkilmək; *The guns began to fire, and the troops fell back Toplar atəş açmağa başladı və qoşun geri çəkildi;* **to ~ behind** geridə/dalda qalmaq; *He fell behind the others in his work O, işində başqalarından geri qaldı;* **to ~ down** 1) yıxılmaq; üzüqoylu düşmək; 2) axınla aşağı getmək *(gəmi və s. haq.)*; 3) *amer. d.d.* iflasa uğramaq; 4) uçulmaq, yıxılmaq *(bina və s. haq.)*; **to ~ in** 1) uçmaq, dağılmaq, sökülmək *(dam və s. haq.)*; 2) *hərb.* sıraya düzülmək; *Fall in! Düzlən! Düzlənin!;* **to ~ off** 1) tökülmək, qopmaq, qopub düşmək/tökülmək; *All the leaves have fallen off Bütün yarpaqlar tökülüb;* 2) uzaqlaşmaq, geri çəkilmək; 3) azalmaq, zəifləmək; 4) pisləşmək, tənəzzül etmək; *The quality of his painting has fallen off greatly Onun şəkillərinin keyfiyyəti xeyli /olduqca pisləşib;* **to ~ on** başlamaq, girişmək *(işə və s.)*; **to ~ out** 1) düşmək, tökülmək, yağmaq; 2) sıradan çıxmaq, savaşmaq, arası dəymək; söyüşmək, küsüşmək; *Discussing the new play the two friends fell out Yeni pyesi müzakirə edərkən dostların arası dəydi;* **to ~ over** arxası üstə yıxılmaq, arxası üstə düşmək; **to ~ through** müvəffəqiyyətsizliyə uğramaq, alt-üst olmaq, puça çıxmaq, baş tutmamaq; *The scheme fell through Plan alt-üst oldu/puça çıxdı;* **to ~ to** girişmək, başlamaq; **to ~ to work** işə girişmək/başlamaq; *They fell to eating with good appetite Onlar böyük iştahla yeməyə girişdilər;* **to ~ at hand** yaxınlaşmaq, çatmaq; **to ~ flat** baş tutmamaq, müyəssər/müvəffəq olmamaq, arzu olunan təsiri bağışlamamaq; *His jokes all fell flat Onun zarafatları tamamilə duzsuz oldu;* **to ~ from grace** günah etmək, günaha batmaq, doğru yolunu azmaq; **to ~ into line** *hərb.* sıraya düzülmək; tabe olmaq, itaət etmək, razı olmaq, razılaşmaq, razılıq vermək; **to ~ into a habit** öyrəşmək, alışmaq, vərdiş/adət etmək; **to ~ out of a habit** tərgitmək, yadırğamaq, yadından çıxartmaq; *He fell out of the habit of smoking O, siqaret çəkməyi tərgitdi;* **to ~ short (of)** müvəffəqiyyətsizliyə/iflasa uğramaq; çatmamaq, kifayət etməmək; *His income falls short of his expenditure Onun gəliri xərclərindən azdır; Our efforts have fallen short Bizim səylərimiz müvəffəqiyyətlə nəticələnmədi;* **to ~ to the ground** yerlə yeksan olmaq, faydasız /nəticəsiz olmaq; **to ~ on *one's* face** biabır/rüsvay olmaq; iflas etmək, müvəffəqiyyətsizliyə uğramaq; **to ~ between two stools** iki yolayrıcında qalmaq

**fallen** [ˈfɔ:ln] *adj* 1. düşmüş, tökülmüş, yıxılmış; ~ **deadwood** yerə tökülmüş quru budaqlar/çılçırpı; ~ **leaves** tökülmüş yarpaqlar; 2. əxlaqsız; ~ **woman** əxlaqsız qadın

**falling¹** [ˈfɔ:lɪŋ] *n* 1. yıxılma, uçulma, sökülmə, dağılma, yağma *(qar, yağış)*; məğlub olma, süqut etmə, devrilmə, düşkünlük; 2. *arx.* enmə, aşağı düşmə, alçalma, azalma

**falling²** [ˈfɔ:lɪŋ] *adj* 1. tökülən; yıxılan, düşən; ~ **leaves** tökülən yarpaqlar; 2. uçulan, dağılan; 3. yağan *(yağış, qar)*; 4. azalan, zəifləyən

**falling-disease** [ˈfɔ:lɪŋdɪˈzi:z] *n* = **falling-sickness**

**falling-off** [ˈfɔ:lɪŋˈɔf] *n* 1. düşkünlük, tənəzzül; 2. süqut etmə

**falling-out** [ˈfɔ:lɪŋˈaut] *n* dalaşma, vuruşma, dava; küsülülük; razı olmama, razılaşmama, ixtilaf; narazılıq, nifaq; küsmə, incimə

**falling-sickness** [ˈfɔ:lɪŋˈsɪknɪs] *n tib.* epilepsiya *(özündəngetmə xəstəliyinin növü)*

**falling-star** [ˈfɔ:lɪŋˈsta:ʳ] *n* meteor, axan/düşən ulduz

**fall-out** [ˈfɔ:lˈaut] *n* 1. meteor, yağıntı, çöküntü; 2. radioaktiv çöküntü; ~ **radioactive dust** radioaktiv tozun çöküntüsü/ çökməsi

**fall-trap** [ˈfɔ:l.træp] *n* tələ

**false¹** [fɔ:ls] *n d.d.* 1. yalançı, yalan danışan; 2. qəlp, saxta, saxta sənəd/kağız

**false²** [fɔ:ls] *adj* 1. yalan, uydurma, səhv, yanlış, xəta; ~ **accusation** uydurma ittiham; **to take a**

~ **step** səhv addım atmaq; ~ **start** *id.* yanlış start, səhv götürülmüş start *(yarışda iştirak edənlərdən birinin komandadan əvvəl hərəkət etməsi)*; uğursuz başlanğıc; **to make a ~ start** uğursuz başlamaq *(bir işi)*; **to give a ~ impression** yanlış təəssürat yaratmaq; 2. süni, yalançı, hiyləgər; xain, xəyanətkar, vəfasız, namərd; ~ **tears** süni/yalançı göz yaşları, riyakarcasına ağlama; ~ **prophet** yalançı peyğəmbər; ~ **pretence** aldatma, yalan, hiylə, kələk, fırıldaq, yalançılıq, hiyləgərlik, riyakarlıq; ~ **to the core** başdan-ayağa yalan; **to be ~ to *smb.'s* trust** bir kəsin inamını doğrultmamaq; **to be ~ to *smb.*** bir kəsi aldatmaq, bir kəsə vəfasız olmaq; 3. qəlp, saxta, yalan; ~ **coin** saxta sikkə *(pul)*; ~ **hair** parik *(süni saç, qoyma saç)*; ~ **teeth** taxma/süni dişlər; ~ **jewelry** saxta daş-qaş/cavahirat; ~ **alarm** yalan həyəcan siqnalı; 4. *hüq.* qanundan kənar, qanunsuz, qeyri-qanuni; ~ **imprisonment** qeyri-qanuni azadlıqdan məhrum etmə; ~ **pretence** yalan, uydurma, fırıldaq, hiyləgərlik, dələduzluq;
◊ **to sail under ~ colours** başqa ölkənin bayrağı altında üzmək; özünü başqası kimi qələmə vermək

**false**[3] [fɔ:ls] *adv:* **to play *smb.* ~** bir kəsi aldatmaq; bir kəsə xəyanət etmək; *His memory played him false Yaddaşı onu aldatdı*

**false-coiner** ['fɔ:ls.kɔɪnə$^{r}$] *n* saxta/qəlp pul kəsən

**false-faced** ['fɔ:ls'feɪst] *adj* saxta, iki sifəti/ üzü olan, riyakar, ikiüzlü

**false-hearted** ['fɔ:ls'ha:tɪd] *adj* xain, xəyanətkar, vəfasız, namərd, satqın

**falsehood** [fɔ:lshud] *n* yalan, hiylə, kələk, fırıldaq; *He never told falsehood O heç vaxt yalan danışmayıb; His falsehood cost us much Onun yalanı bizə baha başa gəldi*

**falsely** ['fɔ:lslɪ] *adv* 1. səhvən, səhv / yanlış olaraq; 2. süni, yalan, yalandan, riyakarlıqla, hiylə ilə; xaincəsinə, vəfasızcasına, vəfasızlıqla, namərdcəsinə; *He was falsely accused of theft Onu səhvən oğurluqda ittiham etdilər*

**falseness** ['fɔ:lsnɪs] *n* 1. yalan, uydurma, saxtalıq, saxtakarlıq, qəlplik, yanlışlıq; **the ~ of charge** ittihamın yanlışlığı/ saxtalığı; 2. səmimiyyətsizlik, ikiüzlülük; sünilik, xainlik, vəfasızlıq, namərdlik, xəyanət

**falsification** ['fɔ:lsɪfɪ'keɪʃn] *n* 1. saxtalaşdırma, saxtalaşdırılma, saxtakarlıq etmə, saxtakarlıq, saxtalıq; təhrif, təhrif etmə / edilmə; 2. *hüq.* saxtakarlıq, saxta *(sənəd)*

**falsificator** ['fɔ:lsɪfɪ.keɪtə$^{r}$] *n* saxtakar, saxtakarlıqla məşğul olan adam

**falsified** ['fɔ:lsɪfaɪd] *adj* 1. saxtalaşdırılmış, saxta qayrılmış; təhrif olunmuş/edilmiş, pozulmuş, korlanmış; 2. saxta, qəlp, uydurulmuş

**falsifier** ['fɔ:lsɪfaɪə$^{r}$] *n* saxtakar, saxtakarlıqla məşğul olan adam, qəlp şey qayıran

**falsify** ['fɔ:lsɪfaɪ] *v* 1. saxtalaşdırmaq, saxtasını qayırmaq; təhrif etmək *(sənədləri və s.)*; 2. ümidi doğrultmamaq; **to ~ a prophecy** qabaqcadan verilmiş xəbəri təkzib etmək, yalanı sübut etmək; *My hopes / fears have been falsified Mənim ümidlərim/qorxum əbəs yerə imiş*; 3. yalan/əsassız olduğunu sübut etmək; təkzib etmək

**falsism** ['fɔ:lsɪzm] *n* ağ yalan

**falsity** ['fɔ:lsɪtɪ] *n* 1. yalan, əsassızlıq, saxtalıq, yanlışlıq, səhvlik; **the ~ of the method** metodun yanlışlığı; 2. ikiüzlülük; sünilik, xainlik, vəfasızlıq, namərdlik, xəyanət; **the ~ of an ally** müttəfiqin xəyanəti/ikiüzlülüyü

**falter** ['fɔ:ltə$^{r}$] *v* 1. büdrəmək, ayağı dolaşmaq; yırğalana-yırğalana getmək; tərəddüdlə getmək; *He faltered across the room O, otaqda ayağı dolaşa-dolaşa gəzdi*; 2. hıqqanmaq, dili dolaşmaq; **to ~ out an excuse** dili dolaşa-dolaşa üzr istəmək; *His tongue falters Onun dili dolaşır*; 3. tərəddüd etmək; *I wouldn't falter to tell him Mən ona tərəddüd etmədən deyərdim*

**faltering** ['fɔ:ltərɪŋ] *adj* 1. qətiyyətsiz, cəsarətsiz, aciz, qərarsız; ~ **steps** qətiyyətsiz addımlar; ~ **voice** titrək səs; 2. dili dolaşan, hıqqıldayan, dili tutulan, duruxa-duruxa danışan

**fame**[1] [feɪm] *n* 1. şöhrət, məşhurluq; **love of ~** şöhrətpərəstlik, şöhrət düşkünlüyü; **to win ~** şöhrət qazanmaq; **to make ~** etibar /ad/şöhrət qazanmaq; **woman of ill ~** fahişə

**fame**[2] [feɪm] *v* məşhur etmək, şöhrətləndirmək, şöhrət qazandırmaq

**famed** [feɪmd] *adj* şöhrətli, məşhur, şöhrət / ad qazanmış; **to be ~ for *smth.*** bir şeyə görə məşhur olmaq

**fameful** ['feɪmfl] *adj* şöhrətli, məşhur, şöhrət / ad qazanmış

**fameless** ['feɪmlɪs] *adj* naməlum, məlum olmayan, tanınmayan, məşhur olmayan; nüfuzu olmayan; **one of the ~ writers of the past century** keçən əsrin tanınmayan yazıçılarından biri

**familiar**[1] [fə'mɪljə$^{r}$] *n* 1. yaxın dost; 2. ailə əhval-ruhiyyəsi; 3. *arx.* ailə üzvü, ev adamı *(ailəyə çox yaxın olan)*

**familiar**[2] [fə'mɪljə$^{r}$] *adj* 1. yaxın, çox yaxın, səmimi; ~ **friends** yaxın dostlar; **to be on ~ terms with *smb.*** bir kəslə dostluq münasibətində olmaq; 2. yaxşı tanış olan *(bir şeylə)*, bilən, bilikli, bələd *(bir şeyə)*; **to be ~ with *smth.*** bir şeyi yaxşı bilmək; **to make oneself ~ with a language** dil öyrənmək; **a ~ sight** tanış mənzərə; **a ~ face / voice** tanış sifət / səs

**familiarity** [fə.mɪlɪ'ærɪtɪ] *n* 1. dostluq, yaxınlıq, yaxın tanışlıq; **to be on terms of ~ with *smb.*** bir kəslə dostluq münasibətində olmaq; 2. yaxşı tanışlıq; yaxşı xəbərdarlıq; *He learnt German but never reached familiarity with it O, alman dilini öyrənirdi, lakin onu heç vaxt əməlli-başlı öyrənə bilmədi*; 3. *pl* sərbəst hərəkət;



*She allowed no familiarities O heç bir sərbəst hərəkətə yol vermədi*

**familiarization, -sation** [fə.mɪljərɪ'zeɪʃn] *n* tanış/bələd olma

**familiarize, -ise** [fə'mɪljəraɪz] *v* tanış/bələd etmək; **to ~ *smb.* with a new job** bir kəsi yeni işlə tanış etmək

**familiarly** [fə'mɪljəlɪ] *adv* 1. yaxın, yaxından, yaxşı; **to be ~ acquainted with *smb.*** bir kəsi yaxşı tanımaq; 2. adətən, bir qayda olaraq; 3. təklifsizcəsinə, sərbəst halda; **to salute *smb.* ~** bir kəsi sərbəst halda salamlamaq

**family**[1] ['fæmɪlɪ] *n* 1. ailə; **a man of ~, a ~ man** ailəli/evli adam; *We don't see of him now that he has become a family man Ailə qurduğu vaxtdan bəri, demək olar ki, biz onu görmürük; How are all your family? Ailən/Ailəniz necədir?*; 2. ailə, nəsil; **a man of ~** adlı-sanlı/məşhur nəsildən olan adam; **a man of good ~** yaxşı ailədən/nəsildən olan adam; **a man of no ~** əsli-nəsli məlum olmayan adam; 3. ailə; fəsilə *(bitki və heyvan sistematikasında: quruluşca bir-birinə oxşar və mənşəcə bir-birinə yaxın bir neçə cins qrupu)*; **cat ~** pişiklər fəsiləsi; **rose ~** gül-çiçəklər fəsiləsi; 4. birlik, təşkilat, ittifaq; **Family of Love** *tar.* xristianlıq məhəbbəti cəmiyyəti *(dini sekta)*; 5. evdə oturmağı sevən adam; *He's never been much of a family man O heç vaxt evdə oturmağı sevən adam olmayıb*;
◊ **first families** *amer.* ilk mühacirlər, bir yerə köçüb yerləşən ilk adamlar; aristokratiya, zadəganlıq; **in a ~ way** sıxılmadan, utanmadan, çəkinmədən; **to be in the ~ way** hamilə olmaq

**family**[2] ['fæmɪlɪ] *n* 1. ailə, ailəvi; evdar/ ailəsini sevən/evcanlı; **a ~ friend** ailə dostu; **a ~ doctor** ailə həkimi; **a ~ name** soyad; 2. irsi, nəsildən-nəslə keçən, miras, nəsil; **a ~ tree** şəcərə, nəsil şəcərəsi

**famine** ['fæmɪn] *n* 1. aclıq *(təbii fəlakət)*; **in the years of ~** aclıq illərində; 2. ac qalma, aclıq çəkmə; **to die of ~** acından/ aclıqdan ölmək; 3. kəskin ehtiyac *(bir şeyə)*; **coal ~** kömürə kəskin ehtiyac

**famish** ['fæmɪʃ] *v* 1. acından öldürmək; 2. ac qalmaq, aclıq çəkmək; *I am famishing d.d. Acından ölürəm*

**famished** ['fæmɪʃt] *adj* ac, bərk acmış, uzun müddət ac qalmış/aclıq çəkmiş

**famishment** ['fæmɪʃmənt] *n* aclıq, ac qalma, aclıq çəkmə

**famous** ['feɪməs] *adj* 1. məşhur, ad /şöhrət qazanmış; *He is a famous explorer/writer /painter O, məşhur tədqiqatçıdır/yazıçıdır / rəssamdır*; **a town ~ for its monuments** öz abidələri ilə məşhur şəhər; 2. *arx.* əla, çox gözəl, çox yaxşı; *That's famous! Əla! He has a famous appetite Onun çox yaxşı iştahası var*

**famously** ['feɪməslɪ] *adv d.d.* əla, çox gözəl, çox yaxşı; *They dined famously in a Chinese restaurant Onlar Çin restoranında çox yaxşı nahar etdilər*

**fan**[1] [fæn] *n* I 1. yelpik; 2. ventilyator; **electric ~** elektrik ventilyatoru; 3. *şair.* qanad; 4. *k.t.* sovurucu maşın; dənsovuran maşın; 5. *k.t.* sovrulmuş dən / taxıl

**fan** [fæn] *n* II *d.d.* entuziast; tərəfdar, azarkeş; həvəskar; **football ~** futbol həvəskarı/azarkeşi; **film ~** kino həvəskarı; **Charlie Chaplin ~** Çarli Çaplinin pərəstişkarı; **a fresh-air ~** təmiz hava həvəskarı

**fan**[2] [fæn] *v* 1. yelləmək, çırpmaq, çırpıb təmizləmək; **to ~ oneself** özünü yelpiklə yelləmək; 2. üfürmək, üfürüb alışdırmaq; **to ~ the flame** alovu üfürüb alışdırmaq; 3. ehtirasları qızışdırmaq; *This conduct fanned his rage Bu cür davranış onun ehtiraslarını qızışdırdı*; 4. sovurmaq *(dəni, taxılı)*;
◊ **to ~ away** qovmaq; **to ~ away the flies** milçəkləri qovmaq; **to ~ out** 1) qollara ayrılmaq / şaxələnmək; *The roads fanned out from the town in all directions Şəhərdən bütün istiqamətlərə yollar ayrılırdı*; 2) *hərb.* cəbhə boyu düzmək

**fanatic**[1] [fə'nætɪk] *n* fanatik; qatı mövhumatçı; **to be a ~ of *smth.*** bir şeyin fanatiki olmaq

**fanatic**[2] [fə'nætɪk] *adj* fanatik, qatı mövhumatçı, qəddar mövhumatçı, vəhşi; ~ **zeal** fanatik həvəs/şövq; ~ **sects** fanatiklər sektaları

**fanatically** [fə'nætɪkəlɪ] *adv* fanatikcəsinə, qatı mövhumatçılıqla

**fanaticism** [fə'nætɪsɪzm] *n* fanatizm, təəssübkeşlik; qatı mövhumatçılıq; **religious ~** dini fanatizm; **dark forces of religious ~** dini fanatizmin qara qüvvələri

**fanaticize** [fə'nætɪsaɪz] *v* 1. fanatik olmaq; 2. fanatikə çevrilmək

**fancier** ['fænsɪə$^{r}$] *n* 1. xəyalpərəst, xəyalçı, fantaziyaçı; 2. həvəskar, yaxşı bilən, yaxşı tanıyan, bələd; 3. dekorator *(dekorasiya rəssamı; bəzəkçi)*

**fanciful** ['fænsɪfl] *adj* 1. şıltaqçı, şıltaq, xəyalpərəst; **a ~ child** şıltaq uşaq; **a ~ writer** xəyalpərəst yazıçı; 2. fantastik, əfsanəvi; xəyali, uydurma, inanılmaz, qeyri-real; **a ~ scheme** qeyri-real plan; 3. qəribə; **a ~ head-dress** qəribə baş örtüyü; ~ **drawings** fantastik şəkillər

**fancifully** ['fænsɪfəlɪ] *adv* qəribə, şıltaqlıqla, ədabazlıqla; *The room was fancifully decorated with flowers Otaq güllərlə qəribə tərzdə bəzədilmişdi*

**fanciless** ['fænsɪlɪs] *adj* xəyaldan/xülyadan məhrum

**fancy**[1] ['fænsɪ] *n* 1. xəyal, xülya; yalan, uydurma; **the power of ~** təsəvvürün/xəyalın/təxəyyülün gücü; 2. göz qabağına gətirilən, xəyali; fikirdə / ürəkdə tutulan surət; illüziya, arzu; **~ies of a poet** bədii surətlər; *I have a fancy that... Mənə elə gəlir ki,...*; 3. şıltaq, naz, kef, tərslik; **pass-**

ing ~ ötüb keçən şıltaqlıq / tərslik; 4. həvəs, meyl, təmayül, arzu, qabiliyyət, şövq; **to have a ~ for** *smb.* bir kəsə meyli olmaq; **to take a ~ for / to** *smb.* bir kəsə bağlanmaq, bir kəsə meyli/bənd olmaq, bir kəsi sevmək; **to take a ~ for** *smth.* bir şeyi istəmək, bir şey xoşuna gəlmək; *The place caught my fancy at once Yer dərhal mənim xoşuma gəldi;* 5. **(the ~)** *top.i* entuziastlar, həvəskarlar; azarkeşlər; *The great book-sale had congregated all the fancy Böyük kitab auksionu bütün həvəskarları bir yerə yığmışdı/cəmləşdirmişdi /toplamışdı*

**fancy²** [ˈfænsı] *adj* 1. qəribə, əcaib; qəşəng; inadcıl, şıltaq, ədabaz, maraqlı, məzəli, gülməli; 2. xəyali; **~ picture** xəyali şəkil; 3. ornamentli, naxışlı, bəzəkli, təmtəraqlı; fasonlu, modelli; **~ bread** fiqurlu çörək; **~ swimming** fiqurlu üzmə; **~ skating** fiqurlu sürüşmə *(buz üzərində)*; 4. modalı, modaya uyğun; dəb, dəbdə olan; gözəl, zərif, incə, nəfis, yüksək keyfiyyətli; **~ articles/goods** son moda ilə tikilmiş mallar; 5. bəzək-düzək, qalantereya; **~ fair** dəbdə olan şeylər bazarı; **~ fruit** çox gözəl meyvə; *This dress is too fancy to wear to work Bu paltar iş üçün həddən artıq qəşəngdir;* 6. fantastik, əfsanəvi, qeyri-adi, çox qəribə, əcaib; **at a ~ price** fantastik dərəcədə yüksək qiymətə; **~ names** uydurma adlar;

◊ **~ girl /lady /woman** aşna, məşuqə; *amer.* fahişə; **~ man** oynaş; sutenyor *(öz aşnası fahişənin xərcilə yaşayan kişi)*

**fancy³** [ˈfænsı] *v* 1. çox böyük fikirdə olmaq *(özü haqqında)*, təsəvvür etmək, təsəvvürə gətirmək; *I can't fancy him as a soldier Mən onu əsgər kimi təsəvvür edə bilmirəm;* 2. güman/zənn/hesab etmək; *I fancy he has gone Güman edirəm, o artıq gedib;* 3. xoşa gəlmək, bəyənilmək, ürəyə yatmaq, sevmək; *I don't fancy this place at all Bu yer əsla mənim xoşuma gəlmir*

**fancy-ball** [ˈfænsıˈbɔ:l] *n* bal-maskarad; karnaval *(oyunlarla, maskaradlarla və xüsusi geyimlərlə keçirilən xalq bayramı)*

**fancy-dress** [ˈfænsıˈdres] *n* maskarad paltarı

**fancy-free** [ˈfænsıˈfri:] *adj* aşiq / vurğun / məftun olmayan

**fancy-work** [ˈfænsıwə:k] *n* 1. naxış tikmə; əl işi; 2. çəki, naxış

**fang¹** [fæŋ] *n* 1. köpək dişi; diş *(heyvanlarda)*; 2. zəhərli diş *(ilanda)*; 3. dişin kötüyü; 4. caynaq;

◊ **to be in a ~** bərk çətinliyə düşmək; **to lose the ~** hədəfi vura bilməmək

**fang²** [fæŋ] *v* 1. dişlərə baxmamaq/fikir verməmək; dişləri başlı-başına buraxmaq; 2. *tex.* doldurmaq *(nasosu işə salmazdan qabaq)*;

◊ **to ~ Christendom** Xristian dinini qəbul etmək, xristian olmaq

**fanged** [fæŋd] *adj* 1. köpək dişləri olan; 2. zəhərli dişə malik olan

**fanging** [ˈfæŋıŋ] *n* 1. *tex.* doldurma *(nasosu)*; 2. ventilyasiya borusu

**fangless** [ˈfæŋlıs] *adj* köpək dişlərdən/ zəhərli dişlərdən məhrum olan

**fan-magazine** [ˈfæn.mægəˈzi:n] *n* "azarkeşlər üçün jurnal" *(kinoulduzların və idmançıların həyatından bəhs edən)*

**fan-mail** [ˈfænmeıl] *n* azarkeşlərdən/pərəstişkarlardan məktublar

**fanner** [ˈfænəʳ] *n* 1. sovurucu maşın; dənsovuran maşın; 2. sovurucu maşının ventilyatoru; 3. ventilyator

**fanning machine** [ˈfænıŋməˌʃi:n] *n* sovurucu maşın; dənsovuran maşın

**fantast** [ˈfæntæst] *n* 1. xəyalpərəst, xülyapərəst; 2. yazıçı-fantazist, fantastik roman yazan müəllif

**fantastic¹** [fænˈtæstık] *n arx.* xəyalpərəst, xülyaçı, fantaziyaçı

**fantastic²** [fænˈtæstık] *adj* 1. qəribə, əcaib; qəşəng, inadcıl, fantastik, əfsanəvi; **~ music** fantastik musiqi; 2. qeyri-adi, çox qəribə; **~ acts of kindness** qeyri-adi mehribanlıq

**fantastical** [ˈfænˈtæstıkl] *adj* = **fantastic²**

**fantastically** [fænˈtæstıkəlı] *adv* 1. qəribə, fantastik; 2. qeyri-real

**fantasticate** [fænˈtæstıkeıt] *v* xəyala qapılmaq, özündən uydurmaq/ toxumaq/ düzəltmək

**fantasy** [ˈfæntəsı] *n* 1. xəyal, təsəvvür, təxəyyül; xülya, yalan, uydurma; *This is no more than fantasy Bu, uydurmadan başqa bir şey deyil;* **by the power of ~** təxəyyülün gücü ilə; 2. sayıqlama, sərsəmləmə; 3. əsassız fərziyyə

**far¹** [fa:] *adj* **(farther, further; farthest, furthest)** uzaq; uzaqlaşdırılmış; **from a ~ country** uzaq ölkədən; **~ journey** uzaq səyahət; **~ future** uzaq gələcək;

◊ **a ~ cry 1)** uzaq məsafə; *It's a far cry to that place* **1)** *O, yerə uzaqdır;* **2)** *Bu böyük fərqdir*

**far²** [fa:ʳ] *adv* **(farther, further; farthest, furthest) 1.** uzaq, böyük məsafədə; dərin; **to dig ~ down** dərin qazmaq; **to wander ~** uzaqda dolanmaq/veyllənmək; **not ~ to seek** yaxında axtarmaq; *How far? Nə qədər uzaq?* **thus ~** indiyə qədər; **that ~** belə uzaq, belə məsafədə; çoxdan, çoxdan bəri; uzaq keçmişdə/gələcəkdə; axırayaxın, axırında *(hər hansı dövrün / vaxtın / müddətin)*; **~ back in the past** uzaq keçmişdə; **as ~ back as June** hələ iyunda; **~ into the night** gecə yarısından xeyli keçmiş; 2. daha, daha da; xeyli çox, çox-çox; daha çox, olduqca; **~ the best of all** qalanların hamısından çox-çox yaxşı; lap yaxşı; **~ different** çox fərqlənən; *He was not far wrong O, həqiqətdən uzaq deyildi;* 3. *birləşmələrdə;* **as ~ as 1)** ...qədər, ...kimi; *We went as far as the station Biz stansiyaya qədər getdik;* **2)** nə qədər, nə dərəcədə; *As far as I remember Xatırladığım kimi,*



*Xatırladığıma görə;* **so ~(as)** ...qədər, ...kimi, indiyə qədər; *It's all right so far Həlalik hər şey qaydasındadır;* **so ~ as I know** mən biləni; **by ~** daha çox, çox-çox, olduqca, daha, daha da; xeyli; **to surpass by ~** xeyli ötüb keçmək, üstün gəlmək, geridə buraxmaq; **to prefer by ~** şübhəsiz üstün tutmaq;

◊ **~ and away** misilsiz bir surətdə, müqayisə edilməz dərəcədə, çox-çox; şübhəsiz; **~ and near** hər yerdə; **~ and wide** hərtərəfli

**far-away** [ˈfa:rəweı] *adj* uzaq; *He is a far-away cousin of mine O mənim uzaq qohumumdur*

**far-back** [ˈfa:bæk] *adj* köhnə, qədim

**far-between** [ˈfa:bıˈtwi:n] *adj* az, nadir; *His visits were few and far-between O çox nadir hallarda baş çəkirdi/gəlirdi*

**farce** [fa:s] *n* 1. yüngül komediya, məzhəkə, şit zarafat, təlxəklik; 2. *məc.* oyunbazlıq, hoqqabazlıq, oyun

**farcer** [ˈfa:səʳ] *n* 1. komediyanın/məzhəkənin/şit zarafatın müəllifi; 2. komediyanın / məzhəkənin / şit zarafatın icraçısı

**farceur** [fa:ˈsə:ʳ] *n fr.* 1. zarafatçı/zarafatcıl/ məzəli adam; 2. hazırcavab *(adam)*, məzəli danışan *(adam)*

**farcical** [ˈfa:sıkl] *adj* 1. gülməli, məzhəkəli, əyləndirici, məzəli; 2. gülünc, gülməli; mənasız, cəfəng

**fare¹** [feəʳ] *n* 1. gediş haqqı *(nəqliyyatda)*; *What is the fare? Gediş haqqı nə qədərdir?, Bilet neçəyədir? All fares, please! Zəhmət olmasa, bilet alın!;* 2. yemək, xörək, qida, yem; azuqə, ərzaq; **homely ~** qaba yem/qida; **simple ~** sadə yemək; **spiritual ~** mənəvi qida; 3. sərnişin; **to pick up a ~** sərnişin götürmək;

◊ **bill of ~** menyu *(yemək siyahısı)*

**fare²** [feəʳ] *v* 1. yaşamaq, dolanmaq, həyat sürmək; *How did you fare during your journey? Səyahət müddətində günün/ gününüz necə keçdi?; He didn't fare very well on his last job Axırıncı iş yerində onun işləri yaxşı deyildi;* 2. yemək, qidalanmaq; 3. *arx. şair.* səyahət etmək;

◊ *Fare you well! Xudahafiz! Əlvida! Salamat qal!/qalın! Sağ ol!/olun!*

**farewell¹** [ˈfeəwel] *int.* 1. *Salamat qal!/qalın! Xudahafiz! Əlvida! Farewell to the holidays! Əlvida bayramlar!* 2. ayrılma, vidalaşma, xudahafizləşmə; **to bid** ***one's*** **~, to take ~ of, to make** ***one's*** **~s** vidalaşmaq, xudahafizləşmək; 3. vida, vidalaşma, ayrılıq; **~ speech** vida nitqi

**farewell²** [feəˈwel] *v* vidalaşmaq, xudahafizləşmək

**far-famed** [ˈfa:ˈfeımd] *adj* çox məşhur, çox şöhrət qazanmış

**far-gone** [ˈfa:ˈgɔn] *adj* həddən artıq, həddini aşmış; *He is far-gone in debt O həddən artıq borca düşüb*

**farina** [fəˈraınə] *n* 1. manna yarması; 2. nişasta, kraxmal, kartof unu

**farm¹** [fa:m] *n* 1. ferma, təsərrüfat; **milk ~** süd ferması; **poultry ~** quşçuluq ferması; 2. kəndli təsərrüfatı; **collective ~** kolxoz; **state ~** sovxoz; **individual ~** fərdi / tək təsərrüfat; 3. tinglik, şitillik, qoruq, qoruq yeri; heyvan yetişdirmə müəssisəsi; 4. fermada yaşayış evi

**farm²** [fa:m] *v* 1. kənd təsərrüfatı ilə məşğul olmaq; *He farms beef cattle O, ətlik mal-qara yetişdirir/saxlayır; Their younger son is farming Onların kiçik oğlu kənd təsərrüfatı ilə məşğul olur;* 2. becərmək *(torpağı)*; *He farmed his own land O öz xüsusi torpağını becərdi;* 3. *(həm də* **~ out)** icarəyə götürmək / vermək; 4. uşağa baxmaq *(pulla)*, uşağı tərbiyə etməyə götürmək

**farmer** [ˈfa:məʳ] *n* 1. fermer; **cattle ~** maldar, mal-qara saxlayan fermer; heyvandarlıq ferması sahibi, icarədar, icarəyə götürən; 2. uşağı tərbiyə etmək üçün götürən adam;

◊ **afternoon ~** qanmaz, işi ləngidən, süründürməçi, ləng adam; tənbəl, başısoyuq *(adam)*

**farmery** [ˈfa:mərı] *n* fermada təsərrüfat üçün tikintilər, tikili binalar, köməkçi tikililər

**farm-hand** [ˈfa:mhænd] *n* kənd təsərrüfatı fəhləsi

**farmhold** [ˈfa:mhould] *n* fermerə mənsub olan torpaq; **a rather big ~** olduqca böyük ferma

**farm-house** [ˈfa:mhaus] *n* fermada yaşayış evi; fermer/kəndli evi

**farming¹** [ˈfa:mıŋ] *n* 1. kənd təsərrüfatı ilə məşğul olma; əkinçilik; **high ~** intensiv/yüksək /səmərəli əkinçilik; **to take up ~** kənd təsərrüfatı ilə məşğul olmaq; 2. icarəyə vermə

**farming²** [ˈfa:mıŋ] *adj* kənd təsərrüfatı; **~ problems** kənd təsərrüfatı problemləri

**farm-stead** [ˈfa:msted] *n* təsərrüfat; malikanə; mülk, evə yapışıq təsərrüfat yerləri

**farm-yard¹** [ˈfa:mˈja:d] *n* fermanın həyəti

**farm-yard²** [ˈfa:mˈja:d] *adj:* **~ manure** peyin, üzvi gübrə

**far-off** [ˈfa:ʳɔf] *adj* uzaq; keçmiş; *It happened in those far-off days Bu, o uzaq keçmişdə baş verdi*

**far-out** [ˈfa:ʳaut] *adj d.d.* 1. həyatdan uzaq düşmüş, ətrafdakıları görməyən; ≅ zəmanə adamı olmayan; 2. tənqidi düşünən/ fikirləşən, skeptik, şübhəli, şəkk-şübhə ilə baxan; ümidi boşa çıxmış; 3. valehedici, heyranedici, məftunedici, çox gözəl, cazibəli, cazibədar

**far-reaching** [ˈfa:ˈri:tʃıŋ] *adj* 1. uzaqməqsədli; **~ plans** uzaqməqsədli planlar; 2. *məc.* böyük, hədsiz, vüsətli; ciddi nəticələr doğura biləcək; **~ effect** ciddi nəticə

**far-seeing** [ˈfa:ˈsi:ıŋ] *adj* uzaqgörən, gələcəyi görən; tədbirli, bəsirətli, gözüaçıq; işinin dalını-qabağını düşünən; ehtiyatlı

**far-sight** [ˈfa:saıt] *n* uzaqdan görmə; uzağı yaxşı görmə

**far-sighted**[1] ['fa:'saıtıd] *n*: **(the ~)** uzağı yaxşı görən adam; **spectacles for the ~** uzağı yaxşı görənlər üçün eynək

**far-sighted**[2] ['fa:'saıtıd] *adj* **1.** uzağı yaxşı görən; **2.** uzaqgörən, gələcəyi görən, tədbirli, bəsirətli, gözüaçıq, ehtiyatlı; *He was known as a wise and far-sighted politician O, müdrik və uzaqgörən siyasi xadim kimi tanınmışdı*

**far-sightedness** ['fa:'saıtıdnıs] *n* **1.** uzağı yaxşı görmə; **2.** uzaqgörənlik, gözüaçıqlıq, gələcəyi görmə qabiliyyəti, ehtiyatlılıq, tədbirlilik

**fart** [fa:t] *v tab. s.* osdurmaq

**farther**[1] ['fa:ðə<sup>r</sup>] *adj* **1.** *(***far**[1]*-sifətinin müq. dər.)*; **2.** daha uzaq; **at the ~ shore** uzaq sahildə; **3.** sonrakı, sonra gələn / olan; **at a ~ stage of development** inkişafın sonrakı mərhələsində; **to prevent ~ communication** sonrakı əlaqələrin qarşısını almaq; **4.** əlavə; *Down he sat without farther bidding O, əlavə dəvəti gözləmədən oturdu; Have you anything farther to say? Sən/ Siz daha nə əlavə edə bilərsən?/bilərsiniz?*; **5.** daha erkən, daha tez, qabaqkı, ondan əvvəlki, keçən

**farther**[2] ['fa:ðə<sup>r</sup>] *adv* **1.** *(***far** *zərfinin müq. dər.)*; **2.** sonra, daha sonra, daha uzaq / uzaqda, daha artıq; *He lives farther O daha uzaqda yaşayır; He can suffer no farther O daha dözə bilmir;* **3.** *arx.* bundan başqa, bir də, həmçinin; hətta, daha çox; *Farther, let us consider the cause Sonra gəl/gəlin, səbəbləri nəzərdən keçirək!*

**farther**[3] ['fa:ðə] *adv* = **further**[3]

**farthermost** ['fa:ðəmoust] *adj* lap uzaq, ən uzaq; **the ~ point** ən uzaq nöqtə/məntəqə; **the ~ distance** ən uzaq məsafə

**farthest**[1] [fa:ðıst] *adj* **1.** *(***far** *sifətinin üst. dər.)* lap/ən uzaq; *It was the farthest point they could reach by car Bu, maşınla onların çata biləcəyi ən uzaq məntəqə idi;* **2.** ən uzun, uzunmüddətli, uzunsürən, ən gec; *He promised to be back by five o'clock at the farthest O ən geci saat beş üçün qayıtmağa söz verdi*

**farthest**[2] [fa:ðıst] *adv* *(***far** *zərfinin üst. dər.)* lap /ən uzaq, ən/lap uzaqda; *Choose the seat farthest from the door Qapıdan lap uzaqda otur /oturun*

**farthing** ['fa:ðıŋ] *n* fartinq *(İngiltərədə ¼ pensə bərabər bürünc pul)*;

◊ **the uttermost ~** axırıncı qəpik; *It's not worth a farthing Bu, bir qəpiyə dəyməz/dəyən deyil*

**fascinate** ['fæsıneıt] *v* **1.** heyran/valeh/məftun /cəzb/bənd etmək; çox maraqlandırmaq/sevindirmək; *The idea of going on a sea-voyage fascinated him Dəniz səyahətinə getmək haqqında fikir onu çox sevindirdi;* **2.** ovsunlamaq; cadulamaq, baxışı ilə hipnoz etmək; *A serpent fascinates its prey İlan öz şikarını hipnoz edir;* **3.** ovsunlamaq, sehrləmək, cadulamaq, tilsimə salmaq

**fascinating** ['fæsıneıtıŋ] *adj* heyranedici, cazibədar, füsunkar, çox gözəl/qəşəng, könülaçan, məftunedici, valehedici; son dərəcə gözəl; **~ smile** heyranedici /cazibədar təbəssüm

**fascinatingly** ['fæsıneıtıŋlı] *adv* füsunkarcasına, füsunkaranə, çox gözəl / qəşəng, heyranedici tərzdə

**fascination** [.fæsı'neıʃn] *n* **1.** cazibə, lətafət, məlahət, cazibədarlıq, füsunkarlıq, gözəllik, hüsn; zəriflik, incəlik; *He learnt the fascination of words O, sözlərin sehrli gücünü öyrəndi;* **2.** *arx.* sehr, cadu, ovsun, cadugərlik, sehrbazlıq, ovsunçuluq

**fascinator** ['fæsıneıtə<sup>r</sup>] *n* sehrbaz, cadugər

**fascism** ['fæʃızm] *n* faşizm

**fascist**[1] ['fæʃıst] *n* faşist

**fascist**[2] ['fæʃıst] *adj* faşist; **~ organization** faşist təşkilatı

**fashion**[1] ['fæʃn] *n* **1.** surət, sima, şəkil; tərz, üsul, qayda; ədа, xasiyyət, adət, tövr, sifət; növ; *He behaved in a strange fashion O özünü qəribə aparırdı; I don't like the fashion of his speech Mən onun danışıq ədasını/tövrünü xoşlamıram*; **in *one's* own ~** özü bildiyi kimi; *He will certainly do it in his own fashion O bunu əlbəttə özü bildiyi kimi edəcək; The grain was threshed after the old fashion Taxılı köhnə qayda ilə döydülər;* **2.** fason, biçim, nümunə, model; əndazə, ülgü, paltar fasonu; *The two cups are made after the same fashion Hər iki fincan eyni fasonda hazırlanıb;* **the ~ of a dress** paltarın fasonu; **3.** üsul, qayda, tərz; moda, dəb, adət; **to keep up with all the latest ~** son modaya riayət / əməl etmək; **to dress in the height of ~** son modaya uyğun geyinmək; **to be the ~, to be in ~** modada/dəbdə olmaq; *This writer was in fashion at the beginning of the century Əsrin əvvəlində bu yazıçı dəbdə/modda idi*; **to bring /to come into ~** dəb salmaq; **to grow into ~** dəbə/modaya düşmək; **to be out of ~** dəbdən/modadan çıxmaq; **a man of ~** aristokrat/kübar dairələrə mənsub olan adam

**fashion**[2] ['fæʃn] *v* forma vermək, formaya salmaq; qayırmaq, hazırlamaq, istehsal etmək *(həm də* **to ~ out**); **to ~ a vase from clay** gildən vaza hazırlamaq/qayırmaq/istehsal etmək; **to ~ a hat out of leaves** yarpaqlardan papaq qayırmaq; *They fashion boats out of tree-trunks Onlar ağac gövdələrindən qayıqlar düzəldirlər*

**fashionable** ['fæʃnəbl] *adj* **1.** modalı, dəbli, moda/dəbdə olan; son moda ilə tikilmiş; **~ clothes** son moda ilə/dəblə tikilmiş paltar; **a ~ hat** modalı papaq; **a ~ dress-maker** modalı paltar tikən dərzi; **a ~ furniture** son moda ilə hazırlanmış; **2.** dəbdəbəli; **a ~ hotel** dəbdəbəli mehmanxana; **3.** modabaz, moda sevən; **a ~ woman** modabaz qadın

**fashionably** ['fæʃnəblı] *adv* moda ilə, dəblə; **to dress ~** moda ilə/dəblə geyinmək



**fashionist** ['fæʃənıst] *n* modapərəst, modabaz, moda sevən, moda ilə geyinən adam

**fashionless** ['fæʃənlıs] *adj* **1.** biçimsiz, formasız; **2.** dəbdə/modada olmayan

**fashion-monger** ['fæʃn.mʌŋgə<sup>r</sup>] *n* = **fashionist**

**fashion-paper** ['fæʃn.peıpə<sup>r</sup>] *n* moda jurnalı

**fast**[1] [fa:st] *n* I cəftə, rəzə, sürmə; sürgü, siyirmə; **door ~** qapı cəftəsi / rəzəsi; **window ~** pəncərə sürgüsü

**fast** [fa:st] *n* II oruc, orucluq; **a day for a general ~** ümumi orucluq günü; **to observe the ~s** oruca riayət etmək, oruc tutmaq; **to break (one's) ~** orucunu yemək/batil etmək; *He broke his fast by drinking some milk O, bir az süd içməklə orucunu yedi/batil etdi*

**fast**[2] [fa:st] *adj* **(-er, -est)** I **1.** möhkəm, bərk, sərt; **~ rocks** sərt qayalar; **~ sleep** bərk/möhkəm yuxu; **hard and ~ rules** möhkəm və sərt qaydalar; **to take/to have ~ hold of *smth.*** bir şeydən möhkəm /bərk yapışmaq; **2.** sadiq, etibarlı; **a ~ friend** sadiq/etibarlı dost; **3.** amansız, qəddar, qatı; **a ~ foe** amansız/qəddar/qatı düşmən

**fast** [fa:st] *adj* **(-er, -est)** II **1.** sürətli, sürət; bərk qaçan; iti/bərk gedən; **a ~ train** sürətli qatar, sürət qatarı; **a ~ horse** bərk/iti qaçan at; **a ~ tank** iti gedən tank; **2.** irəli gedən *(saat haq.)*; *My watch is 5 minutes fast Mənim saatım 5 dəqiqə irəlidir*; **3.** yüngülxasiyyət, əxlaqsız, dəmdəməki, arsız; **to lead a ~ life** əxlaqsız həyat sürmək; **the ~ set** *top. i* kefçəkən/əyyaş/avara adamlar; **a ~ woman** yüngülxasiyyət/ gəzəyən qadın;

◊ **~ and loose** qeyri-sabit, dəyişkən, etibarsız; **to pull a ~ one** *amer.* aldatmaq, tovlamaq, hiylə/kələk/fırıldaq gəlmək

**fast**[3] [fa:st] *v* **1.** oruc tutmaq; *Muslims fast during Ramadan Ramazan ayında müsəlmanlar oruc tuturlar*; **2.** heç nə yeməmək; *I have been fasting since morning Mən səhərdən bəri heç nə yeməmişəm*

**fast**[4] [fa:st] *adv* I bərk, bərk-bərk; möhkəm, möhkəm surətdə, möhkəmcəsinə; **to sleep ~** bərk yatmaq; *The lake was frozen fast Göl bərk/möhkəm donmuşdu; He was fast bound by the feet Onun ayaqlarını möhkəm surətdə/bərk-bərk bağlamışdılar*

**fast** [fa:st] *adv* II **1.** tez, cəld, sürətlə; **to run ~** cəld/sürətlə qaçmaq; *His health was breaking fast Onun səhhəti sürətlə pisləşirdi*; **2.** yüngül, düşüncəsiz; əxlaqsız, əxlaqsızcasına; **to live ~** əxlaqsızcasına yaşamaq, yüngül/əxlaqsız həyat sürmək;

◊ **to play ~ and loose** məsuliyyətsiz hərəkət etmək, vədi pozmaq

**fasten** ['fa:sn] *v* **1.** bağlamaq, düyünləmək; **to ~ the window** pəncərəni bağlamaq; *The lock would not fasten Kilid/Qıfıl bağlanmır;* **to ~ shoe-laces** çəkmənin bağlarını bağlamaq; **to ~ two parcels together** iki bağlamanı bir-birinə bağlamaq; **to ~ a boat to a tree** qayığı ağaca bağlamaq; **2.** möhkəmləndirmək, bərkitmək; vintləmək, vintləyib bərkitmək, burmaq, burub bərkitmək; sıxmaq; **3.** düymələmək; *She fastened her gloves O, əlcəklərini düymələdi / bağladı; Her skirt wouldn't fasten Onun yubkası düymələnmirdi;* **4.** bərkimək; *The plaster fastens slowly Suvaq yavaş-yavaş bərkiyir*; **5.** zilləmək, yönəltmək, döndərmək, çevirmək, bir yerə toplamaq/yığmaq/cəmləşdirmək, mərkəzləşdirmək *(nəzəri, diqqəti və s.)*; *He fastened his eyes on the picture O, gözünü şəklə zillədi;*

◊ **to ~ a quarrel upon *smb.*** bir kəsə yersiz irad tutmaq

**fastener** ['fa:snə<sup>r</sup>] *n* **1.** sürgü, siyirmə, rəzə; **2.** düymə, ilgək; çarpaz; toqqa, bənd; **3.** kağız üçün qısqac, sancaq

**fastening** ['fa:snıŋ] *n* **1.** bağlama, sarıma, bəndləmə, bənd etmə, bitişdirmə, düyünləmə; **2.** qıfıllama, kilidləmə; qıfıllanma, kilidlənmə

**faster** ['fa:stə<sup>r</sup>] *n* pəhriz saxlayan, oruc tutan *(adam)*

**fastidious** [fæs'tıdıəs] *adj* **1.** tələbkar, şıltaq, vasvası, inadcıl, tərs; *Don't be so fastidious Belə inadcıl/tərs olma/olmayın!* **2.** nazik, incə, zərif, həssas, iti *(qulaq, göz haq.)*; **~ hands** zərif əllər; **~ mind** iti zehin/ağıl/zəka

**fastidiously** [fæs'tıdıəslı] *adv* **1.** şıltaqcasına, şıltaqlıqla, vasvasılıqla; inadcıl halda; *He picked at his food fastidiously O, çəngəllə yeməyini vasvasılıqla qurdalayırdı;* **2.** nazik, incə; **3.** *məc.* ustalıqla, məharətlə; *The work was done fastidiously Bu iş böyük ustalıqla/məharətlə görülüb*

**fastidiousness** [fæs'tıdıəsnıs] *n* **1.** şıltaqlıq, vasvasılıq, inadcıllıq; ehtiyatlılıq, ciddilik, tələbkarlıq; **2.** incəlik, zəriflik, həssaslıq, ustalıq, məharət; kəskinlik, itilik

**fasting** ['fa:stıŋ] *n* pəhriz, orucluq

**fasting-day** ['fa:stıŋdeı] *n* pəhriz/orucluq günü

**fastness** ['fa:stnıs] *n* I **1.** möhkəmlik, bərklik, davamlılıq; səbat, mətanət, sarsılmazlıq, yenilməzlik; **~ to light** işığa davamlılıq *(rənglər, boyalar haq.)*; **2.** qala, istehkam, dayaq; istinadgah; *The soldiers retired to their fastness Əsgərlər geri öz istehkamlarına çəkildilər;* **3.** immunitet *(orqanizmin yoluxan xəstəliklərə tutulmamaq qabiliyyəti)*

**fastness** ['fa:stnıs] *n* II **1.** tezlik, yeyinlik, itilik, sürət; **2.** yüngülxasiyyətlilik, dəmdəməkilik, yelbeyinlik, yüngüllük; arsızlıq; **3.** pis yola getmə, əxlaqsızlıq; ədəbsizlik; *His face bore the marks of fastness Onun üz-gözündən pozğunluq tökülürdü*

**fast-setting** ['fa:st.setıŋ] *adj* tez bərkiyən *(sement və s. haq.)*

**fat**[1] [fæt] *n* **1.** yağ, piy, iç yağı; **vegetable ~** bitki yağı; **to fry *smth.* in deep ~** bir şeyi bol yağda qızartmaq; **2.** köklük, tosqunluq; **to be inclined**

to ~ kökəlməyə meylli olmaq; **to run to ~** piylənmək, piy bağlamaq, kökəlmək; 3. ən yaxşı hissə *(bir şeyin);* **to live on the ~ of the land** çox qəşəng/yaxşı yaşamaq; bütün nemətlərdən istifadə etmək; 4. *tex.* yağlama, maz, tavot *(avtomobilin və s. sürtülən hissələrinə yaxmaq üçün yağ)*

**fat**[2] [fæt] *adj* 1. yağlı, piyli; **~ soup** yağlı sup; **~ mutton** yağlı qoyun əti; **~ coal** dəmirçi kömürü, yağlı kömür; **~ clay** yağlı gil; 2. yoğun, kök, tosqun, koppuş; *He has grown fat O çox kökəlib/yoğunlayıb*; **as ~ as a pig** donuz kimi kök/yağlı; **~ cheeks** koppuş yanaqlar; **~ fingers** yoğun barmaqlar; 3. kökəldilmiş; **~ ox** kökəldilmiş öküz; 4. münbit, məhsuldar, bərəkətli, qüvvətli *(torpaq haq.); A fat soil yields a good crop Münbit torpaq bol məhsul verir;* 5. bol məhsul verən, bol məhsullu, məhsuldar, bərəkətli; *It was a fat year for fruit Bu il meyvə bol oldu;* 6. təntənəli, zəngin *(bir şeylə);* **a ~ feast** təntənəli/ zəngin ziyafət; 7. *d.d.* faydalı, sərfəli, gəlirli; **~ job** gəlirli iş; 8. küt; anlamaz, qanmaz, fəhmsiz, kütbeyin, gecqanan, malbaş, sarsaq, axmaq; **~ smile** axmaq təbəssüm; 9. *poliqr.* **~ type** qara şrift

**fat**[3] ['fæt] *v* 1. kökəltmək *(kəsmək üçün)*; **to ~ up fowls** quşları kökəltmək; 2. piylənmək, piy bağlamaq, kökəlmək

**fatal** ['feɪtl] *adj* 1. labüd, qaçılmaz; bədbəxt, faciəli, fəlakətli, bədbəxtlik gətirən, nəticəsi pis olan, həlledici, qəti, son; **the ~ hour** həlledici saat/dəqiqələr; ölüm saatı/dəqiqələri; *The great heat was fatal to many persons Bərk isti hava çox adamlar üçün fəlakətli oldu;* 2. məhvedici/öldürücü, ölümlə nəticələnən; **~ wound** öldürücü/ölümlə nəticələnən yara; *He was the victim of a fatal accident O, bədbəxt hadisənin qurbanı oldu*

**fatalism** ['feɪtəlɪzm] *n* fatalizm *(qəzavü-qədərə / olacağa / qismətə inanma)*

**fatalist** ['feɪtəlɪst] *n* fatalist *(qəzavü-qədərə /olacağa / qismətə inanan adam)*

**fatalistic** ['feɪtə'lɪstɪk] *adj* fatalist

**fatality** [fə'tælɪtɪ] *n* 1. fəlakət, məhvedicilik, fəlakətlilik; 2. bədbəxtlik, qəza, bədbəxt hadisə, faciə, müsibət, ölüm *(müharibədə, bədbəxt hadisədə və s.);* **a wreck with ten fatalities** on nəfərin ölümü ilə nəticələnən qəza; 3. məhkumluq, məhkum olma; 4. tale, alın yazısı, labüdlük, qaçılmazlıq, qarşısı alınmazlıq; **to believe in ~** taleyə inanmaq

**fatally** ['feɪtəlɪ] *adv* 1. faciəli tərzdə; labüddən, istər-istəməz, mütləq; 2. çox pis, çox zərərli, fəlakətli; ölümcül; **~ wounded** ölümcül yaralanmış

**fatalness** ['feɪtəlnɪs] *n* 1. labüdlük, zərurilik; 2. fəlakət, ölümcüllük

**fat-brained** ['fæt'breɪnd] *adj* sarsaq, səfeh, axmaq, gic, ağılsız; küt, qanmaz, fərasətsiz, kütbeyin

**fate**[1] [feɪt] *n* 1. tale, bəxt, qismət, alın yazısı, fələk; **the irony of ~** taleyin istehzası; **to leave *smb.* to his ~** bir kəsi özbaşına/ köməksiz /taleyin ümidinə buraxmaq; **to accept *one's* ~** taleyi ilə barışmaq; **to decide/to fix/to seal *smb.'s* ~** bir kəsin taleyini həll etmək; 2. tələf/məhv olma, fəlakət, ölüm; **to go to *one's* ~** ölümünü qarşılamaq; **to meet *one's* ~** ölmək;
◊ **no flying from ~** taledən qaçmaq olmaz

**fate**[2] [feɪt] *v* məhkum/qismət olmaq; *They were not fated to meet Onlara görüşmək qismət olmadı*

**fated** ['feɪtɪd] *adj* 1. irəlicədən/qabaqcadan müəyyən edilmiş; ***one's* ~ lot in life** bir kəsin həyat qisməti; 2. məhkum edilmiş; **the ~ city** məhkum edilmiş şəhər

**fateful** ['feɪtfl] *adj* 1. bədbəxt, faciəli, fəlakətli, bədbəxtlik gətirən, nəticəsi pis olan, həlledici; **the ~ hour** taleyin yazdığı saat; 2. peyğəmbərcəsinə söylənmiş; uğursuz, nəhs, məşum; **the ~ cawings of the crow** qarğanın nəhs qarıldaması; 3. əhəmiyyətli, mühüm; həlledici əhəmiyyətə malik; **~ decision** mühüm/həlledici əhəmiyyətə malik qərar

**fat-faced** ['fætfeɪst] *adj* 1. yekəsifət; 2. *poliqr.* qara *(şrift haq.);* **~ words** qara şriftlərlə yazılmış sözlər

**fat-guts** ['fætgʌts] *n d.d. kob.* kök kişi, şişman adam

**fat-head** ['fæthed] *n* sarsaq, gic, səfeh, axmaq, küt, qanmaz *(söyüş)*

**fat-headed** ['fæt'hedɪd] *adj* küt, korazehin, kütbeyin, qanmaz, sarsaq, səfeh, axmaq, gic, başıboş, yelbeyin

**father**[1] ['fa:ðə$^r$] *n* 1. ata; **adoptive ~** atalıq; **natural ~** kəbinsiz uşağın atası; 2. havadar, tərəfdar, müdafiəçi, himayəçi; **to be a ~ to *smb.*** bir kəsə atalıq etmək/ata qayğısı göstərmək; 3. yaradan, yaradıcı; **the Fathers of the Constitution** *amer. tar.* ABŞ kostitusiyasının müəllifləri/yaradıcıları; **Father of the Constitution** "Konstitusiyanın atası" *(prezident Medisonun ləqəbi);* **the Fathers of the Church** kilsənin ataları; ulu baba, əcdad, soy başı, bani, cədd; **the Father of English printing** İngiltərədə çapçılığın banisi; 4. yaşlı üzv; **city ~s** şəhər idarəsinin üzvləri, şəhər məsləhətçiləri; **Father of the House** *amer.* nümayəndələr palatasının yaşlı üzvü *(palatada olduğu müddətə görə);* **Father of the Senate** *amer.* "senatın atası, yaşlı senator *(senatda fasiləsiz olduğu müddətə görə);* 5. mənəvi ata; keşiş; yepiskop *(baş keşiş);*
◊ **~ Abraham** Avraam ata *(Avraam Linkolnun ləqəbi);* **the Father of the Faithful** dindarların atası, Xəlifə; *Like father, like son at. söz. Oğul ataya oxşayar, ≅ Ot kökü üstə bitər*

**father**[2] ['fa:ðə$^r$] *v* 1. doğmaq, doğurmaq, törətmək; *Cowardice fathers cowardice Qorxaqlıq qorxaqlığı törədir;* 2. müəllif /yaradıcı/yaradan olmaq; 3. **(on)** müəllifliyi müəyyən etmək; 4. bir ata kimi qayğı göstərmək; *He would father small boys first come to school O həmişə məktəbə yenicə gəlmiş balaca oğlanlara bir ata kimi qayğı göstərirdi*



**fatherhood** ['fa:ðəhud] *n* atalıq; *He was greatly proud of his fatherhood O fəxr edirdi ki, ata olub*

**father-in-law** ['fa:ðərɪnlɔ:] *n (pl* **fathers-** ['fa:ðəz-] 1. qayınata *(arvadın/ərin atası)*; 2. = **stepfather**

**fatherland** ['fa:ðəlænd] *n* vətən, ana yurd/ vətən

**fatherless** ['fa:ðəlɪs] *adj* 1. atasız, atası olmayan; **to be left ~** atasız qalmaq; 2. müəllifi naməlum; **~ essays** müəllifi naməlum oçerklər

**fatherlike**[1] ['fa:ðəlaɪk] *adj* ata, atalıq; mehriban, şəfqətli, ürəyinazik, incəqəlbli

**fatherlike**[2] ['fa:ðəlaɪk] *adv* ata kimi, atayana, atasayağı

**fatherliness** ['fa:ðəlɪnɪs] *n* atalıq qayğısı, mehribanlıq

**fatherly**[1] ['fa:ðəlɪ] *adj* 1. ata, atalıq, ataya xas olan; **~ responsibility** atalıq məsuliyyəti; **~ blessing** atalıq xeyir-duası; 2. mehriban, riqqətli, şəfqətli, ürəyinazik, incəqəlbli; **~ kiss** zərif /mehriban öpüş

**fatherly**[2] ['fa:ðəlɪ] *adv* = **fatherlike**[2]

**fathership** ['fa:ðəʃɪp] *n* atalıq

**fathom**[1] ['fæðəm] *n* 1. dəniz sajını *(182 sm-ə bərabər ölçü)*; 2. anlama, dərk etmə, qavrama

**fathom**[2] ['fæðəm] *v* 1. dərinliyi ölçmək *(suyun)*; 2. anlamaq, dərk etmək, başa düşmək; **to ~ a mystery** sirri başa düşmək

**fathomless** ['fæðəmlɪs] *adj* 1. ölçüyə gəlməyən, ölçülə bilməyən, ölçüyəgəlməz, son dərəcə çox; çox dərin, hədsiz; **the ~ depths of the ocean** okeanın hədsiz dərinlikləri; 2. anlaşılmaz, dərkedilməz, ağlasığmaz; **~ mystery** anlaşılmaz sirr

**fatidic** [feɪ'tɪdɪk] *adj* peyğəmbər, peyğəmbərcəsinə söylənmiş, düzgün; *Those proved to be fatidic words Məlum oldu ki, bunlar peyğəmbərcəsinə söylənilmiş sözlərdir*

**fatidical** [feɪ'tɪdɪkl] *adj* = **fatidic**

**fatigable** [fə'tɪgəbl] *adj* asanca/tez yorulan, əldən düşən

**fatigue**[1] [fə'ti:g] *n* 1. yorğunluq; **bodily / mental ~** fiziki/zehni yorğunluq; **to drop with ~** yorğunluqdan taqəti kəsilmək; 2. yoruculuq, üzücülük, darıxdırıcılıq, usandırıcılıq; yorucu iş; 3. *k.t.* qüvvədən düşmə *(torpaq haq.)*

**fatigue**[2] [fə'tɪ:g] *v* 1. çox yormaq, əldən/taqətdən salmaq, üzmək; 2. çox yorulmaq, əldən düşmək, üzülmək; 3. *hərb.* təsərrüfat işlərini yerinə yetirmək

**fatigue-call** [fə'tɪ:g(')kɔ:l] *n hərb.* təsərrüfat işlərinin yerinə yetirilməsinə çağırış

**fatigue-dress** [fə'tɪ:g(')dres] *n hərb.* əsgərin iş paltarı

**fatigue-duty** [fə'tɪ:g'dju:tɪ] *n hərb.* təsərrüfat işi

**fatigueless** [fə'tɪ:glɪs] *adj* yorulmaz, usanmaz, yorulmaq/usanmaq bilməyən

**fatiguesome** [fə'tɪ:gsəm] *adj şair.* yorucu, əziyyətli, üzücü, usandırıcı, darıxdırıcı

**fatiguing** [fə'tɪ:gɪŋ] *adj* yorucu, əziyyətli, üzücü, usandırıcı, darıxdırıcı, çox ağır, çox yorğun, əldən salan; **~ day** üzücü/ usandırıcı/darıxdırıcı gün

**fatless** ['fætlɪs] *adj* yağsız *(yemək haq.)*; **a ~ diet** yağsız pəhriz; **~ meat** yağsız ət

**fatness** ['fætnɪs] *n* 1. köklük, yağlılıq, yoğunluq; 2. məhsuldarlıq, münbitlik, bərəkətlilik *(torpaq haq.)*

**fat-tailed** ['fæt'teɪld] *adj* quyruqlu; **~ sheep** quyruqlu qoyun

**fatted** ['fætɪd] *adj* kökəldilmiş *(kəsmək üçün)*

**fatten** ['fætn] *v* 1. kökəltmək *(kəsmək üçün)*; piylənmək, piy bağlamaq, kökəlmək; *The sheep fatten quickly on these rich pastures Bu zəngin otlaqlarda qoyunlar tez kökəlir;* 2. gübrələmək *(torpağı)*

**fattest** ['fættest] *n k.t.* yağlılığı müəyyən etmək üçün götürülən nümunə *(süd və s. haq.)*

**fattiness** ['fætɪnɪs] *n* 1. köklük; 2. piy basma, piylənmə; həddindən artıq kökəlmə; 3. piylilik, yağlılıq, köklük

**fatty**[1] ['fætɪ] *n d.d.* kök kişi, şişman adam

**fatty**[2] ['fætɪ] *adj* 1. yağlı; 2. kök, koppuş

**fatuity** [fə'tju:ɪtɪ] *n* 1. sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq; 2. ağıl zəifliyi, kəmağıllıq

**fatuous** ['fætjuəs] *adj* 1. sarsaq, gic, səfeh, axmaq, ağılsız, mənasız; **~ smile** mənasız təbəssüm; **~ attempt** mənasız təşəbbüs; 2. kəmağıl

**fatuously** ['fætjuəslɪ] *adv* gic-gic, mənasızcasına, axmaqcasına, ağılsız-ağılsız

**fat-witted** ['fæt'wɪtɪd] *adj* küt, korazehin, qanmaz, kütbeyin, malbaş; ağılsız, başıboş

**fault**[1] [fɔ:lt] *n* 1. nöqsan, qüsur; eyib, zədə; **a ~ in cloth** parçada qüsur; **to acknowledge *one's* ~s** öz nöqsanlarını etiraf etmək; *It is his great fault Bu onun böyük nöqsanıdır;* 2. təqsir, suç, günah; *The fault lies with you, not with me Təqsirkar sənsən/sizsiniz, mən yox;* **in/at ~** günahkar, təqsirkar; *I am not in fault Mən təqsirkar deyiləm; Who is in fault? Kimdir təqsirkar? It is my fault Bu mənim təqsirimdir;* **party in/at ~** *hüq.* günahkar tərəf; 3. səhv; yanlış, xəta, diqqətsizlik; *Your essay contains many faults in Grammar Sənin/Sizin oçerkində/oçerkinizdə çoxlu qrammatik səhvlər var;* 4. nalayiq/yaramaz hərəkət; **to be at ~** səhv etmək, yanılmaq; **a child's ~s** uşağın nalayiq hərəkətləri; 5. *tex.* qəza, korlanma, nasazlıq, pozğunluq;
◊ **to be at ~** çətin vəziyyətdə olmaq; **to find ~**

**with** ***smb.*** bir kəsə yersiz irad tutmaq; *Every man has his faults Nöqsansız adam yoxdur*

**fault²** [fɔ:lt] *v* **1.** təqsirkar hesab etmək, təqsirləndirmək, müqəssir etmək; günahkar bilmək, qınamaq; yersiz irad tutmaq; **2.** səhv etmək, səhvə yol vermək

**fault-finder** [ˈfɔ:lt.faındəʳ] *n* **1.** bəhanə axtaran *(adam),* hər şeyə irad tutan *(adam),* bəhanəçi, hər şeydən əmma çıxaran; **2.** qüsuru müəyyən edən cihaz

**fault-finding¹** [ˈfɔ:lt.faındıŋ] *n* **1.** yersiz irad tutma xasiyyəti, bəhanə tapma; öcəşmə, sataşma, yersiz irad; **2.** *tex.* qəzanı/zədəni aşkar etmə

**fault-finding²** [ˈfɔ:lt.faındıŋ] *adj* bəhanə axtaran, hər şeyə irad tutan, bəhanəçi

**faultful** [ˈfɔ:ltful] *adj* **1.** səhv, yanlış, xətalı, düzgün/doğru olmayan; **2.** təqsirkar, günahkar, suçlu

**faultless** [ˈfɔ:ltlıs] *adj* **1.** eyibsiz, nöqsansız, qüsursuz, ləkəsiz, təmiz; **~ pronunciation** qüsursuz tələffüz; **2.** səhvsiz; *His reasons proved faultless Onun dəlilləri tamamilə düzgün idi;* **3.** günahsız, təqsirsiz, suçsuz

**faultlessly** [ˈfɔ:ltlıslı] *adv* **1.** nöqsansız, eyibsiz, qüsursuz olaraq, yaxşı, təmiz; *He is always faultlessly dressed O həmişə qüsursuz geyinir;* **2.** səhvsiz olaraq

**faulty** [ˈfɔ:ltı] *adj* **1.** nöqsanları / qüsurları olan; nöqsanlı, kəsirli; **~ digestion** qüsurlu/nöqsanlı həzm etmə; **~ condition** *tex.* qüsurlu vəziyyət; **2.** yanlış, doğru/düzgün olmayan; **~ argument** yanlış dəlil; **3.** xarab edilmiş / olmuş, zədəli, yararsız; **~ mechanism** xarab olmuş mexanizm

**fauna** [ˈfɔ:nə] *n* fauna; **~ of the Ice Age** buzlaşma dövrünün faunası

**favour¹** [ˈfeıvəʳ] *n* **1.** xeyirxahlıq, iltifat, meyl, rəğbət, təvəccöh, hüsn-rəğbət; **to win** ***smb.'s*** **~, to find ~ in** ***smb.'s*** **eyes/in th eyes of** ***smb.*** bir kəsin rəğbətini qazanmaq; **to be /to stand high in** ***smb.'s*** **~, to be in high ~ with** ***smb.*** bir kəsin etimadını qazanmaq, bir kəsin sevimlisi olmaq, bir kəsin xeyirxahlığından istifadə etmək; **to enjoy the ~s of a woman** qadının xeyirxahlığından istifadə etmək; **to look with ~ on** ***smb.*** bir kəsə xeyirxahlıqla baxmaq; **to look with ~ on smth.** bir şeyi bəyənmək; **to take a ~ for** ***smb.*** bir kəsi sevmək, bir kəsə vurulmaq/aludə olmaq; **to claw ~ with** ***smb.*** bir kəsə yaltaqlanmaq; **2.** xidmət, kömək; gülərüzlülük; mərhəmət, lütfkarlıq; *Do me / him a favour Mənə/Ona lütfkarlıq göstər/göstərin;* **to do** ***smth.*** **as a ~** bir şeyi təmənna ilə etmək; **to heap ~s upon** ***smb.*** bir kəsə qarşı çox mərhəmətli olmaq; **3.** himayə, havadarlıq, himayəçilik; hamilik; *He succeeded in winning the favour of the authorities O, hakimiyyət nümayəndələrinin himayəsini qazanmağa müvəffəq oldu;* **4.** istifadə etmə; müdafiə etmə / edilmə; **under ~ of darkness** qaranlıqdan istifadə edərək; **5.** *arx.* icazə, müsaidə, izin; *By/With your favour Müsaidənlə/Müsaidənizlə; Please, favour me with an answer Lütfən, mənə cavab ver/verin;* **6.** *birləşmələrdə:* **in ~ of** tərəfində; *He was in favour of women's suffrage O, qadınlara seçki hüququnun verilməsinə tərəfdar idi;* xeyrinə, adına; **in** ***smb.'s*** **~** bir kəsin xeyrinə; **to withdraw in ~ of another** başqasının xeyrinə. imtina etmək; **to draw a check in** ***smb.'s*** **~** bir kəsin adına çek yazmaq

**favour²** [ˈfeıvəʳ] *v* **1.** xeyirxahlıq/mərhəmət göstərmək, xeyirxah olmaq, iltifat göstərmək; *The judge favoured plaintiff Hakim iddiaçıya qarşı xeyirxahlıq göstərdi; He favoured them with a copy of his book O, iltifat göstərib kitabının bir nüsxəsini onlara məmnuniyyətlə bağışladı;* **2.** kömək etmək, şərait yaratmaq, asanlaşdırmaq, yardım etmək; *The darkness favoured his escape Qaranlıq onun qaçmasına kömək etdi/şərait yaratdı;* **3.** müdafiə etmək, tərəfdar olmaq, bəyənmək, təqdir etmək; *He couldn't favour the proposal O, təklifi müdafiə edə bilmədi; These facts favour his theory Bu faktlar onun nəzəriyyəsini təqdir edir;* **4.** himayə / havadarlıq etmək, qanadı altına almaq, həvəs/meyl göstərmək; **5.** *d.d.* ehtiyatla işlətmək, qorumaq, gözləmək, hifz etmək, muğayat olmaq; *He sat in the shade to favour his eyes O, gözlərini qorumaq üçün kölgədə oturdu; The boxer favoured his injured hand Boksçu zədəli əlini qoruyurdu;* **6.** *d.d.* xatırlatmaq, oxşamaq; *The child favours his mother Uşaq anasına oxşayır*

**favourable** [ˈfeıvrəbl] *adj* **1.** əlverişli, münasib, yararlı, müvafiq; yaraşan, uyğun gələn; yerli; **~ answer** münasib cavab; *The moment is not favourable for it Vaxt bunun üçün münasib deyil;* **2.** xeyirxah, iltifatlı, meyl/təvəccöh göstərən, xeyirxahlığa meylli; *He was quite favourable to our project O bizim layihəni tamamilə xeyirxahlıqla qarşıladı;* **3.** təqdiredici, razılıq ifadə edən, müsbət; **~ report** müsbət rəy

**favourableness** [ˈfeıvrəblnıs] *n* xeyirxahlıq, iltifat, meyl, münasiblik, müvafiqlik

**favoured** [ˈfeıvəd] *adj* **1.** sevimli; imtiyazlı, üstünlüklərə malik olan, üstün tutulan; **~ friend** sevimli dost; **~ few** seçmə / imtiyazlı adamlar; **2.** *mürəkkəb sözlərin komponenti kimi:* **well-~** gözəl, cazibədar; **ill-~** çirkin; kifir

**favourer** [ˈfeıvərəʳ] *n* **1.** arxa, kömək, hami, himayə edən, himayəçi, havadar; **2.** köməkçi, tərəfdar

**favourite¹** [ˈfeıvərıt] *n* **1.** istəkli/sevimli/əziz *(adam);* **2.** sevimli şey; *That book is a great favourite of mine Bu mənim ən sevimli kitabımdır;* **3. (the ~)** *id.* favorit *(at yarışında birinciliyə ən çox şansı olan at)*

**favourite²** [ˈfeıvərıt] *adj* sevimli, istəkli, sevilən, sevgili, əziz, ən çox sevilən, ən sevimli; **a ~ child** sevimli/istəkli uşaq; *My favourite novelist is Scott Mənim sevimli yazıçım Skotdur;*

◊ **~ son** *amer.* **1)** ən yaxşı oğul *(şəhərdə və s.);* **2)** öz ştatının nümayəndələri tərəfindən prezidentliyə irəli sürülən şəxs *(partiyanın seçkiqabağı qurultayında)*

**favouritism** [ˈfeıvərıtızm] *n* favoritizm, dostbazlıq, aşnabazlıq

**fawn¹** [fɔ:n] *n* **1.** cavan maral *(bir yaşa qədər);* **2.** sarı-qəhvəyi rəng

**fawn²** [fɔ:n] *v* **1.** quyruq bulamaq *(it haq.);* **2. (on/upon)** yaltaqlıq etmək, qulluq göstərmək; **to ~ on/upon** ***smb.*** bir kəsə yaltaqlanmaq/yaltaqlıq etmək

**fawner¹** [ˈfɔ:nəʳ] *n* yaltaq, qab dibi yalayan

**fawning** [ˈfɔ:nıŋ] *adj* **1.** mehriban, nəvazişli *(it haq.);* **2.** yaltaq, yaltaqcasına; **~ smile** yaltaq təbəssüm

**fawningly** [ˈfɔ:nıŋlı] *adv* **1.** mehribancasına, nəvazişlə; *The dog wagged his tail fawningly İt quyruğunu mehribancasına buladı;* **2.** yaltaqcasına, yaltaq-yaltaq; **to speak ~** yaltaqcasına/yaltaq-yaltaq danışmaq

**fax¹** [fæks] *n* faks; **to send by ~** faksla göndərmək; **to receive ~** faks almaq

**fax²** [fæks] *adj* faks; **a ~ machine** faks maşını; **~ number** faks nömrəsi; *My fax number is 0171 436 4130 Mənim faks nömrəm 0171 436 4130-dur*

**fax³** [fæks] *v* faksla göndərmək *(sənədin və s. surətini)*

**fealty** [ˈfi:əltı] *n* sadiqlik, vəfalılıq, sadiqliyə and içmə; **to do/to make/to swear ~** sadiq olmağa and içmək; **to owe ~ to** ***one's*** **friends** dostlarına sadiq olmaq

**fear¹** [fıəʳ] *n* **1.** qorxu; **needless ~s** nahaq / əsassız qorxular; **in ~** qorxu/həyəcan içində; **to be in ~** qorxu içində olmaq; *They set out on the journey in fear and trembling Onlar qorxu və həyəcan içərisində səyahətə yola düşdülər;* **for ~** qorxudan; *She daren't enter for fear of the dog O, itdən qorxduğundan içəri girməyə cəsarət etmir;* **to fall into ~** *arx.* qorxuya düşmək; **to put** ***smb.*** **in ~, to put ~ in** ***smb.'s*** **heart** bir kəsi qorxuya/vahiməyə salmaq; **2.** əndişə, qorxu, ehtiyat, çəkinmə; *I had a fear that you had lost the train Mən qorxdum ki, sən/siz qatara gecikmisən / gecikmisiniz; There is no fear of his coming here Onun bura gəlişindən ehtiyat etmək lazım deyil;* **3.** titrəmə, əsmə, lərzə, həyəcan; **to put the ~ of God into** ***smb.*** bir kəsi Allah xofu ilə qorxutmaq;

◊ **without ~ or favour** qərəzsiz, obyektiv, tərəf tutmadan

**fear²** [fıəʳ] *v* **1.** qorxmaq; *She has always feared mice O həmişə siçandan qorxub; Don't fear – I will hold your hand Qorxma/Qorxmayın, mən sənin/sizin əlindən/əlinizdən tutacam; Never fear d.d. Qorxma/Qorxmayın;* **2.** ehtiyat etmək, çəkinmək *(arzu edilməyən bir şeydən);* **to ~ the worst** lap pisindən qorxmaq; **3.** *arx.* qorxutmaq, hədələmək, qorxuya salmaq

**feared** [fıəd] *adj* təşvişə / qorxuya salınmış, narahat edilmiş, bədbəxtlik gözləyən

**fearer** [ˈfıərəʳ] *n* qorxaq, cəsarətsiz *(adam)*

**fearful** [ˈfıəfl] *adj* **1.** dəhşətli, qorxulu, qorxunc, müdhiş; **a ~ road accident** dəhşətli yol hadisəsi; *They drove along the edge of a fearful precipice Onlar qorxulu uçurumun kənarı ilə getdilər (miniklə);* **2.** bərk qorxudulmuş/hürküdülmüş, qorxmuş, hürkmüş; **to cast ~ glances at** ***smb.*** hürkək nəzərlə bir kəsə baxmaq; **3. (for)** qorxan, qorxu keçirən; **~ for his safety** öz təhlükəsizliyi üçün qorxan; **4.** qorxaq, ürəksiz, cəsarətsiz, ağciyər, hürkək; **~ to offend** incitməkdən qorxan; **5.** dəhşətli, qorxulu, qorxunc, müdhiş; **to be in a ~ mess** dəhşətli/qorxulu bir işə düşmək

**fearfully** [ˈfıəflı] *adv* olduqca, çox, həddən artıq, son dərəcə; **~ pleased** çox məmnun; **~ expensive** olduqca/çox bahalı

**fearless** [ˈfıəlıs] *adj* **1.** qorxmaz, qoçaq, cəsarətli, mərd, cürətli, cəsur, qorxu bilməyən; **a ~ mountaineer** qorxmaz/cəsarətli/ cəsur/qorxu bilməyən alpinist; **2.** *arx.* dinc, sakit, zərərsiz, ziyansız

**fearlessly** [ˈfıəlıslı] *adv* qorxmadan, çəkinmədən, cəsarətlə, mərdliklə; mərdcəsinə, cəsuranə

**fearlessness** [ˈfıəlısnıs] *n* qoçaqlıq, qorxmazlıq, cəsarət, mərdlik, cəsurluq, qorxu bilməmə

**fear-monger** [ˈfıə.mʌŋgəʳ] *n* küyçü, hay-küyçü, çaxnaşma/hay-küy salan

**fearsome** [ˈfıəsəm] *adj şair.* **1.** qorxunc, qorxulu, dəhşətli, acıqlı, zəhmli, vahiməli, müdhiş; qorxuya səbəb olan; **~ appearance** qorxulu/qorxunc/dəhşətli görkəm; **2.** qorxaq, cəsarətsiz, ağciyər, son dərəcə utancaq

**feast¹** [fi:st] *n* **1.** böyük qonaqlıq, ziyafət, kef məclisi; bayram, şənlik; şadyanalıq; qonaqlıq; banket; **marriage ~** toy ziyafəti; **to make a ~** qonaqlıqda olmaq, kef/ bayram etmək; **to make a ~ of** ***smth.*** yeyib kef etmək; **2.** ləzzət, zövq, nəşə, həzz; **a ~ for the eyes** gözoxşayan mənzərə; **a ~ of intelligent conversation** ağıllı müsahiblərlə söhbətdən alınan ləzzət; **3.** dini bayram; hər il qeyd edilən kilsə bayramı; **movable/immovable ~s** müxtəlif / eyni günlərdə qeyd olunan bayramlar;

◊ **a ~ for the gods** çox gözəl yemək; **a ~ of fat things** zəngin/dəbdəbəli ziyafət/ qonaqlıq

**feast²** [fi:st] *adj* bayram; **~ day** bayram günü; **~ rite** bayram adətləri/qaydaları, bayram mərasimi

**feast³** [fi:st] *v* **1.** qonaqlıqda olmaq, kef / bayram etmək; *They feasted the night away Onlar bütün gecəni kef etdilər;* **2.** qonaq etmək/eləmək; qəbul etmək; təbrik etmək *(təntənə ilə);* ...şərəfinə bayram düzəltmək, alqışlamaq; **to ~**

**one's friends** dostlarını qonaq etmək; 3. ləzzət/ zövq /həzz almaq, nəşələnmək; **to ~ the ears with music** musiqidən ləzzət/zövq almaq; 4. bayram etmək *(Milad və s. bayramları)*

**feaster** ['fi:stə$^r$] *n* 1. ziyafətin/bayramın iştirakçısı/təşkilatçısı; 2. zərif və ləzzətli yeməkləri həddindən artıq sevən, ağzının dadını bilən; epikürçü *(kef və nəşəni hər şeydən üstün tutan adam, kefcil, işrətpərəst)*

**feastful** ['fi:stful] *adj* 1. şən, xoşbəxt, məmnun, sevinc, sevincli, şad, şux; 2. möhtəşəm, təmtəraqlı, təntənəli, dəbdəbəli, qəşəng, gözəl, parlaq; 3. bayramlarla/ziyafətlərlə həddindən artıq maraqlanan

**feat**[1] [fi:t] *n* 1. qoçaqlıq, igidlik, rəşadət, qəhrəmanlıq, hünər, fədakarlıq; **~ of arms** döyüş qəhrəmanlığı; 2. ustalıq, bacarıq, hünər, məharət, sənətkarlıq, cəldlik, diribaşlıq, zirəklik, çeviklik; *The acrobat's performance was a regular feat Akrobatın çıxışı əsl məharət / ustalıq idi;* 3. *arx.* iş, sənət, peşə; **(the) ~ of war** müharibə sənəti; **~s of war** hərbi vəzifə; hərbi təlim;
◊ **by ~ of** ... vasitəsilə, ...köməyilə, ...yolu ilə, ...üsulu ilə; **by way of ~** zorla, güclə, zor gücü ilə; **upon the ~** haqqında, barəsində, xüsusunda

**feat**[2] [fi:t] *adj* 1. yaraşan, uyğun gələn, yararlı; münasib, əlverişli, lazımlı, gərəkli; 2. cəld, diribaş, zirək, çevik, bacarıqlı, mahir; məharətli, usta; 3. səliqəli, təmizkar, təmiz; zərif, incə, gözəl, qəşəng *(paltar haq.)*

**feather**[1] ['feðə$^r$] *n* 1. lələk, tük *(quşlarda)*; **as light as a ~** tük kimi yüngül; 2. *pl* lələklər; plümaj *(papağa vurulan quş lələyindən bəzək)*; geyim, paltar, bəzək, zinət, bəzək-düzək, yaraşıq; **full ~** yaraşıqlı/bəzəkli paltar; **to preen one's ~s** bəzənmək, özünə bəzək vermək; 3. quş, ov quşları; 4. çox yüngül bir şey, boş/ əhəmiyyətsiz şey; 5. çat *(qiymətli daşda, şüşədə)*; 6. *tex.* mil, uc, çıxıntı, zivana, diş;
◊ **to smooth one's rumpled ~s** özünü qaydaya salmaq; sakitləşmək, sakit/rahat olmaq; **birds of a ~** ≅ bir yuvanın quşu; *Birds of a feather flock together at. söz.* ≅ *Taylı tayını tapar, Su axar çuxurunu tapar; Fine feathers make fine birds* ≅ *Gözəllik ondur, doqquzu dondur;* **to be in full/fine good / great/ high ~** 1) yaxşı ovqatda və sağlam olmaq; 2) dövlətli/çox pullu olmaq; **to cut a ~** bir işin təfsilatını həddən artıq öyrənmək; bir şeyi həddən artıq təfsilatı ilə danışmaq; əhəmiyyətsiz/ boş/mənasız şeydən ötəri mübahisə etmək; **to show the white ~** qorxmaq, çəkinmək, ürəksizlik etmək, cəsarətsizlik /qorxaqlıq göstərmək

**feather**[2] ['feðə$^r$] *v* 1. lələk vurmaq, lələklə bəzəmək; 2. lələklə döşəmək *(yuvanı)*; 3. *(həm də* **to ~ out**) tükü gəlmək, lələklənmək, lələk buraxmaq;
◊ **to ~ one's nest** cibini doldurmaq, varlanmaq

**feather-bed**[1] ['feðəbed] *n* 1. pərqu/tük döşək; yumşaq yer; 2. *zool.* silviya quşu *(oxuyan quş)*

**feather-bed**[2] ['feðəbed] *v* əzizləmək, ərköyün böyütmək, nazlamaq, nazını çəkmək

**feather-bedded** ['feðə.bedɪd] *adj* ərköyün/ şıltaq böyüdülmüş

**feather-brain** ['feðəbreɪn] *n* yüngül, dəmdəməki, boş adam

**feather-brained** ['feðə'breɪnd] *adj* sarsaq, səfeh, axmaq, gic, ağılsız; qanmaz, başıboş, yelbeyin

**feathered** ['feðəd] *adj* 1. lələklənmiş, lələkli; 2. lələk vurulmuş / taxılmış, lələklə bəzənmiş; **the ~ tribe** quşlar/qanadlılar aləmi; 3. lələyəoxşar, lələyəbənzər; 4. qanadlı, yeyin, sürətli; **~ words** qanadlı sözlər, zərbi-məsəl

**feather-footed** ['feðə'futɪd] *adj* 1. lələklərlə örtülmüş qıçlara malik olan; 2. cəld və səssiz hərəkət edən

**feather-head** ['feðəhed] *n* başıboş, səfeh, sarsaq, ağılsız, gic, axmaq *(adam)*

**feather-headed** ['feðə'hedɪd] *adj* sarsaq, səfeh, axmaq, gic, ağılsız; qanmaz, başıboş, yelbeyin, fərasətsiz, kütbeyin *(adam haq.)*

**featherless** ['feðəlɪs] *adj* lələksiz, lələyi olmayan, lələkdən məhrum

**feather-weight** ['feðəweɪt] *n* 1. çox yüngül çəki; 2. çox yüngül adam /əşya; 3. *id.* yarımyüngül çəki

**feathery** ['feðərɪ] *adj* 1. tüklü, lələkli, qanadlı, lələklərlə örtülmüş; 2. lələk taxılmış, lələklə bəzənmiş

**feature**[1] [fi:tʃə$^r$] *n* 1. *pl* üzün cizgiləri; **a man of handsome ~s** sifəti yaraşıqlı adam; 2. xüsusiyyət, xarakterik xüsusiyyət; əlamət, nişanə, xassə, sifət; *A lake is an important feature of a landscape Göl mənzərənin mühüm əlamətidir;* **the geographical ~s of a district** rayonun coğrafi xüsusiyyətləri; 3. məqalə, oçerk *(qəzetdə, jurnalda)*

**feature**[2] ['fi:tʃə$^r$] *v* 1. xarakterik xüsusiyyəti fərqləndirmək, xarakterik/səciyyəvi olmaq, ayırmaq; **small hills which ~ the landscape** bu mənzərəni səciyyələndirən balaca təpələr; *String quartets feature a style more characteristic of the century Simli kvartetlər keçən əsrin musiqisi üçün xarakterikdir/səciyyəvidir;* 2. təsvir etmək, çəkmək *(şəkil)*, cızmaq, ümumi şəkildə təsvir etmək; 3. qəzetdə dərc etmək *(görünən yerdə); Her article was featured in this magazine Onun məqaləsi bu jurnalın görünən yerində dərc edilmişdi*

**featured** ['fi:tʃəd] *adj* 1. səciyyəyə/xarakterik xüsusiyyətə malik olan; 2. emal edilmiş/pardaqlanmış daş; 3. şöhrətli, məşhur, şöhrət qazanmış, səs salmış, gurultu qoparmış; **~ attraction** şöhrət qazanmış tədbir *(tamaşa, sərgi və s.)*; **~ actor** baş rollardan birini ifa edən aktyor

**feature-length** ['fi:tʃəleŋθ] *adj* tammetrajlı; **a ~ film** tammetrajlı film



**featureless** ['fi:tʃəlɪs] *adj* 1. gözəçarpan/xarakterik səciyyəvi xüsusiyyəti olmayan; 2. tamam düz *(yer haq.)*; 3. ifadəsiz, yekrəng, maraqsız

**feature-writer** ['fi:tʃə.raɪtə$^r$] *n* 1. oçerk yazan, jurnalist; 2. radio verilişləri üçün mətnlərin müəllifi

**febricity** [fɪ'brɪsɪtɪ] *n arx.* qızdırma, titrətmə; qızdırmalı vəziyyət

**febricula** [fɪ'brɪkjulə] *n tib.* yüngül qızdırma, hərarət

**febriculose** [fɪ'brɪkjulouz] *adj tib.* yüngül qızdırması olan

**febriculosity** [fɪ.brɪkju'lɔsɪtɪ] *n tib.* qızdırma, titrətmə, qızdırmalı vəziyyət, hərarət

**February** ['februərɪ] *n* fevral; **in ~** fevralda; **February days** fevral günləri; **~ fair-maid** xoccəgülü, novruzgülü, qargülü

**fecund** ['fi:kənd] *adj* 1. münbit, məhsuldar; **~ soil** münbit/məhsuldar torpaq; **~ writer** məhsuldar yazıçı; 2. tez artan/çoxalan, törəyib artan; **~ beasts** tez törəyib artan heyvanlar; 3. münbitləşdirən, məhsuldar edən

**fecundate** ['fi:kəndeɪt] *v* 1. *biol.* münbitləşdirmək, məhsuldar etmək; 2. *məc.* yaradıcılıq fəallığı oyatmaq

**fecundation** [.fi:kən'deɪʃn] *n* münbitləşmə, münbitləşdirmə, məhsuldar etmə

**federacy** ['fedərəsɪ] *n* 1. ittifaq, birlik, müqavilə; 2. federasiya *(birləşmiş olan ayrı-ayrı müstəqil dövlətlərdən ibarət dövlət)*

**federal**[1] ['fedər(ə)l] *n* federalist *(federalizm tərəfdarı)*

**federal**[2] ['fedər(ə)l] *adj* 1. federativ, federasiyaya aid; ittifaq; 2. *amer.* federativ, hökumət, ümumdövlət; **Federal government** federativ hökumət; **Federal constitution** ABŞ-ın federal konstitusiyası

**federalism** ['fedərəlɪzm] *n* federalizm

**federalist** ['fedərəlɪst] *n* 1. federalist; federalizm tərəfdarı; 2. *amer. tar.* federalist

**federalistic** [.fedərə'lɪstɪk] *adj* federalizm, federalist; federalizm ideyalarına tərəfdar

**federalization** [.fedərəlaɪ'zeɪʃn] *n* federasiya halına salma, federal idarə üsulu qurma

**federalize** ['fedərəlaɪz] *v* federal idarə üsulu qurmaq; federasiya / ittifaq yaratmaq

**federation** [.fedə'reɪʃn] *n* 1. federasiya, ittifaq *(dövlətlərin)*; cəmiyyətlərin/təşkilatların və s. ittifaqı /birliyi; **the International Women's Federation** Beynəlxalq Qadınlar Federasiyası; 2. federasiyanın yaradılması; federasiya halında birləşmə

**federationist** [.fedə'reɪʃnɪst] *n* federasiya tərəfdarı

**federatist** ['fedərətɪst] *n* = **federationist**

**federative** ['fedərətɪv] *adj* federativ

**fed-up** ['fed'ʌp] *adj d.d.* bir şeydən cana doymuş /təngə gəlmiş; **young generation ~ with sensational novels** sensasiyalı romanlardan təngə gəlmiş/bezmiş gənc nəsil

**fee**[1] [fi:] *n* 1. qonorar; mükafat, haqq, əvəz, muzd; **doctor's/lawyer's ~** həkimin/vəkilin qonorarı; **officials' ~** çinovniklərin / məmurların/hökumət qulluqçularının maaşı; **tuition ~s** təhsil haqqı; *One must pay a considerable fee for a consultation Məsləhət üçün xeyli pul vermək lazımdır;* **no ~ show** qonorar verilməyən şou; 2. çaypulu, bəxşiş; *Fees are prohibited here Burada "çaypulu" verilmir (elan);* 3. haqq, pul; **admission ~** daxil olma haqqı; **club ~** klub üzvlük haqqı; **to pay one's ~s** haqqını ödəmək; 4. rüsum, vergi; **custom-house ~s** gömrük rüsumu/vergisi; **licence ~s** lisenziya üçün haqq;
◊ **not to set/to value at a pin's ~** əhəmiyyət verməmək; saymamaq, hesablaşmamaq

**fee**[2] [fi:] *v* 1. qonorar/maaş vermək; **to ~ a doctor** həkimə maaş vermək; 2. çaypulu vermək; **to ~ a waiter** ofisianta çaypulu vermək

**feeble**[1] ['fi:bl] *adj* 1. (-r [-blə$^r$]; -st [-blɪst]) zəif; **a ~ lamp/cry** zəif lampa/qışqırıq; **~ pulse** zəif nəbz; *The book fell from his feeble grasp Kitab onun zəifləmiş əlindən düşdü;* 2. kiçik, balaca, cüzi, çox kiçik/az, əhəmiyyətsiz, dəyərsiz; **~ hope** cüzi/çox az ümid; **~ attempt** zəif təşəbbüs; **~ argument** əhəmiyyətsiz dəlil; 3. arıq, cansız; gücdən düşmüş; **~ old man** gücdən düşmüş qoca kişi; **to grow ~** zəifləmək, gücdən düşmək; *He's a feeble sort of chap O, zəif/cansız adamdır;* 3. zəif, davamsız; **a flower with a ~ stem** zəif saplaqlı gül; 4. ifadəsiz, sönük; zəif, təsirsiz; **~ work** sönük/ zəif əsər

**feeble**[2] ['fi:bl] *v arx.* gücdən/zəif salmaq, zəiflətmək, zəifləşdirmək

**feeble-minded** ['fi:bl'maɪndɪd] *adj* 1. ağıldan zəif, kəmağıl; ağıldankəm, ağlı çatmayan, gictəhər; sarsaq; 2. iradəsiz, iradəsi zəif, qətiyyətsiz

**feeble-mindedness** ['fi:bl'maɪndɪdnɪs] *n* 1. ağıldan zəiflik, kəmağıllıq; 2. iradəsizlik, iradə zəifliyi

**feeblish** ['fi:blɪʃ] *adj* zəif, zəiftəhər, cılız

**feebly** ['fi:blɪ] *adv* 1. zəif; gücdən düşmüş / taqətsiz halda; *The patient spoke feebly Xəstə taqətsiz bir surətdə danışdı;* 2. aydın olmayan, qeyri-müəyyən bir surətdə, solğun, sönük, zəif; *The light shone feebly through the slit Yarıqdan zəif işıq düşürdü*

**feed**[1] [fi:d] *n* 1. yedirtmə, yedirmə, yedirilmə, qidalandırma, yemə, qidalanma, yemləmə, yemlənmə, yem/yemək vermə; *Let the horse have a feed Atı yemlə/ yemləyin, Ata yem ver /verin;* **to have a good ~** *d.d.* doyunca yemək; 2. yem; **~ for pigs** donuzlar üçün yem;
◊ **to be off one's ~** iştahasını itirmək

**feed**[3] [fi:d] *v (pt, pp* **fed** [fed]) 1. yedirmək, yem vermək, əmizdirmək, döş/süd vermək *(uşağa)*; **to ~ a baby at the breast** uşağa döş vermək, uşağı əmizdirmək; **to ~ oneself** yemək *(müstəqil surətdə); The patient is too weak to feed himself Xəstə çox zəif olduğu üçün özü yeyə bilmirdi.*

*The baby can't feed itself yet Uşaq hələ özü yeyə bilmir;* 2. yemək vermək, təmin etmək, saxlamaq, bəsləmək; *He has a family of five to feed O, beş nəfərdən ibarət ailəni saxlamalıdır; Children are very well fed in this camp Bu düşərgədə uşaqlara çox yaxşı yemək verirlər; The land will feed a thousand head of cattle Bu torpaq min baş mal-qaranı yedirə bilər;* 3. təchiz/təmin etmək; *The river is fed by two tributaries Bu çay iki qoldan su alır; They feed turnips to cows Onlar şalğamı inəklərə yem kimi verirlər;* 4. otarmaq *(mal-qaranı);* 5. otlamaq *(heyvanlar haq.); The cows are feeding in the pasture İnəklər örüşdə otlayırlar;* 6. *zaraf.* yemək, qarnını bərkitmək *(adam haq.); We feed at 6 o'clock Biz saat 6-da qarnımızı bərkidirik;* 7. **(on, upon)** yemlənmək, yemək, qidalanmaq *(bir şeylə); Cattle feed chiefly on grass Mal-qara əsasən ot yeyir/ otla qidalanır;* **to ~ on *smb.*** bir kəsin hesabına dolanmaq, bir kəsə yük olmaq; 8. *tex.* təmin / təchiz etmək *(yanacaqla. su ilə)*

**feeder** ['fi:dəʳ] *n* 1. *d.d.* qarınqulu *(adam);* **a large / gross ~** acgöz, qarınqulu, doymaz *(adam);* 2. *amer.* tərbiyəçi, məşqçi

**feeder airline** ['fi:də'eəlaın] *n* yerli təyyarə xətti/hava yolu

**feeder airliner** ['fi:də'eəlaınəʳ] *n* yerli hava yolunun sərnişin təyyarəsi

**feeding** ['fi:dıŋ] *n* 1. yedirtmə, qidalandırma; **forcible ~** *tib.* zorla yedirtmə; 2. qida, xörək; 3. otlaq; 4. *id.* ötürmə *(topu)*

**feeding-bottle** ['fi:dıŋ-bɔtl] *n* əmzik şüşəsi

**feeding centre** ['fi:dıŋ-sentə] *n k.t.* yem hazırlayan sex; yem mətbəxi *(mal-qara üçün yem hazırlanan yer)*

**feeding crop** ['fi:dıŋkrɔp] *n k.t.* yem bitkiləri

**feeding standard** ['fi:dıŋ'stændəd] *n k.t.* yem norması

**feeding tube** ['fi:dıŋtju:b] *n tib.* süni qida borusu

**feed-trough** ['fi:dtrɔf] *n* yem təknəsi *(heyvanlar üçün)*, axur

**feel**[1] [fi:l] *n* 1. toxunma hissi, toxunmaqla hiss etmə; **cold/smooth to the ~** toxunmaqla soyuq/hamar olmanı hiss etmə; *Let me have a feel İcazə ver / verin, toxunum (əl ilə yoxlayım);* **by the ~** əl ilə, əl ilə yoxlayaraq; *I can tell that this is silk by the feel Əl ilə yoxlayaraq mən müəyyən edə bilərəm ki, bu. ipəkdir;* 2. duyğu, hiss; *This handle has a sticky / greasy feel Bu dəstək yapışqanlıdır/yağlıdır;* 3. duyma, hiss etmə/duyma qabiliyyəti; *She has a feel for good poetry Onun yaxşı şerləri duyma qabiliyyəti var;* 4. şərait; *The factory had a homely feel Fabrikdə səmimi şərait vardı (yəni rəsmiyyətçilik yox idi)*

**feel**[2] [fi:l] *v (pt. pp* **felt** [felt]) 1. toxunmaq, dəymək, əl vurmaq / dəymək, əl ilə yoxlamaq; *He felt the coat to see if it was wet O, əli ilə paltonu yoxladı ki, onun yaş olub-olmamasını bilsin; The blind recognize objects by feeling them Korlar əşyaları əl ilə yoxlayaraq müəyyən edirlər; The doctor felt my pulse Həkim nəbzimi yoxladı;* 2. axtarmaq, araşdırmaq, eşələmək, əl ilə yoxlaya-yoxlaya axtarmaq; *He felt in his purse and took a penny out of it O, pul kisəsini eşələdi və oradan bir pens çıxartdı;* **to ~ for *smth.*** bir şeyi əl ilə yoxlaya-yoxlaya axtarmaq; **to ~ in *one's* pocket for a box of matches** kibrit qutusunu cibində axtarmaq *(əli ilə);* 3. hiss etmək, duymaq; *I felt the floor trembling Mən hiss etdim ki, döşəmə titrəyir; He knows how it feels to be hungry O bilir, ac olmaq nə deməkdir;* **to ~ *smb.'s* presence in the dark** qaranlıqda bir kəsin olduğunu hiss etmək; *I feel ten years younger Mən özümü on il cavan hiss edirəm;* 4. bir şeyin xoşagetməz təsirini hiss etmək; **to ~ the heat / the cold** istini / soyuğu çətinliklə keçirmək; **to ~ the liquor** alkoqolun *(spirtin, spirtli içkinin)* təsirini hiss etmək, məstliyi hiss etmək; 5. mütəəssir olmaq, həyəcan keçirmək, hiss etmək, acısını çəkmək/dadmaq, keçirmək; *She feels her friend's death O, dostunun ölümündən mütəəssirdir;* **to ~ an insult deeply** təhqirdən həddsiz mütəəssir olmaq; 6. başa düşmək, dərk etmək, qavramaq, mənimsəmək; **to ~ music/poetry deeply** musiqini/poeziyanı dərindən hiss etmək/başa düşmək; 7. qabaqcadan anlamaq/duymaq/hiss etmək; *He felt the truth O, deyilənin həqiqət olduğunu anladı; I feel that he has told the truth Mən hiss edirəm, o, düzünü deyib;* 8. güman /zənn / fərz / hesab etmək; *I felt it necessary to interfere Mən hiss etdim ki, müdaxilə etmək lazımdır; I can feel winter coming Qışın yaxınlaşmasını hiss edə bilirəm;* **to ~ for *smb.*** bir kəsə ürəyi acımaq/yanmaq, bir kəsin dərdinə şərik olmaq; *I feel for you deeply Mən sənin/sizin dərdinə/ dərdinizə şərikəm;* **to ~ up to doing *smth.*** bir şeyi etmək iqtidarında olmaq; *I don't feel up to walking now Mən indi getmək iqtidarında deyiləm;* **to ~ like doing *smth.*** bir şeyi etmək arzusunda olmaq; *I feel like having a cup of tea Mən bir fincan çay içərdim; I don't feel like eating Mən yemək istəmirəm, Mən aclıq hiss etmirəm;* **to ~ ill** xəstə hiss etmək; **to ~ tired** yorğunluq hiss etmək; **to ~ bad** pis hiss etmək *(özünü)*; **to ~ bad about *smth.*** bir şeyə görə əzab/əziyyət çəkmək, bir şey haqqında narahat olmaq; *My foot feels better Ayağım nisbətən yaxşıdır;* **to ~ empty** aclıq hiss etmək; **to ~ mean** təqsirkar hiss etmək *(özünü)*; **to ~ small** alçaldılmış / hörmətdən salınmış / təhqir edilmiş kimi hiss etmək *(özünü)*; *I feel cold/hot Mənə soyuqdur / istidir; The air felt warm Hava isti idi; How cold your hand feels Əlin/Əliniz necə də soyuqdur; The room feels damp Otaq rütubətlidir; This armchair feels very comfortable Bu kreslo çox rahatdır*



**feeling**[1] ['fi:lıŋ] *n* 1. duyğu, hiss, hiss etmə /duyma qabiliyyəti, fikir; **~ of hunger** aclıq hissi; *The sudden blow made him lose all feeling Gözlənilməz zərbə onun özündən getməsinə səbəb oldu;* 2. həssaslıq; *I have no feeling in my arm Qolum keyləşib/keyiyib; I have no feeling in my right leg Sağ ayağım keyləşib;* **a sense of ~** toxunma hissi, toxunmaqla hiss etmə, lamisə; **~ of *smb.'s* pockets** bir kəsin ciblərini əl ilə yoxlama/axtarma; 3. hiss, duyğu, həyəcan, təəssürat, emosiya; **a ~ of pride** iftixar hissi; **a ~ of gratitude** minnətdarlıq hissi; **a man of ~** həssas/nazikürəkli/emosional adam; **to speak with ~** emosiya ilə danışmaq; **to have strong ~s on *smth.*** bir şeyi ürəyinə salmaq, bir şeydən çox mütəəssir olmaq; *He has strong feelings on his wife O, arvadı haqqında sakit danışa bilmir; Take care not to hurt his feelings Çalış/Çalışın ki, onun heysiyyətinə toxunmayasan/toxunmayasınız; The conversation helped her to relieve her feelings Söhbət ona ürəyini boşaltmağa kömək etdi;* **to control *one's* ~s** özünü saxlamaq / ələ almaq, hisslərinə nəzarət etmək; **to have no ~ for *smb.*** bir kəsə qarşı laqeyd olmaq; 4. həyəcan, vəlvələ, əndişə, çaxnaşma, təşviş, iztirab, narahatlıq, ehtiras, həvəs; *Feeling ran high at the time Bu vaxt ehtiraslar qızışdı; The speech aroused strong feeling on all sides Nitq bütün tərəfləri həyəcana gətirdi;* 5. fikir, rəy, mülahizə; təəssürat; *He expressed his feelings about the latest discoveries O, son kəşflər haqqında öz fikrini bildirdi/ifadə etdi;* 6. qavrayış, qavrama, dərk etmə, bilmə, anlama, başa düşmə *(incəsənəti, gözəlliyi və s.);* **to have a deeper ~ for beauty** gözəlliyi dərindən hiss etmək/başa düşmək; 7. emosional şərait/əhval-ruhiyyə; *His new picture is full of feeling Onun yeni tablosu böyük həvəslə çəkilib;* **to play the piano with ~** pianonu ruh yüksəkliyi ilə çalmaq; 8. qabaqcadan hiss etmə, ürəyə damma, duyma; **to have a ~** hiss etmək; *He had feeling that something was going to happen Onun ürəyinə dammışdı ki, nə isə baş verəcək;*

◊ **good ~** mehribanlıq, səmimilik, dostcasına münasibət, xeyirxahlıq; **ill ~** düşmənçilik, ədavət, bədxahlıq, qərəzkarlıq; **to bear good / ill ~** mehribanlıq / düşmənçilik hissləri keçirmək

**feeling**[2] ['fi:lıŋ] *adj* 1. həssas, təsirli, kəskin; 2. səmimi, həyəcanlı; **~ speech** həyəcanlı/ təsirli nitq; 3. dərin *(hiss haq.);* **~ grief** dərin kədər

**feign** [feın] *v* 1. hiylə/riyakarlıq etmək, yalandan özünü ... göstərmək/... oxşatmaq/ ... qoymaq, ...vurmaq; **to ~ indifference/ surprise** özünü yalandan laqeyd göstərmək; **to ~ a sickness** özünü xəstəliyə vurmaq; 2. qondarmaq, düzəltmək, quraşdırmaq; **to ~ an excuse** bəhanə uydurmaq; **to ~ a story** əhvalat uydurmaq; 3. saxtalaşdırmaq *(sənədi)*

**feigned** [feınd] *adj* 1. yalançı, hiyləgər, riyakar, ikiüzlü, süni, uydurma; **~ smile** süni / saxta təbəssüm; **to write in a ~ hand** dəyişdirilmiş xətlə yazmaq; **to speak in a ~ voice** səsini dəyişdirərək danışmaq; 2. uydurulmuş, uydurma, qondarma, xəyali; **~ name** uydurulmuş ad; 3. saxta; *They presented him with a feigned copy, not with original Onlar ona saxta nüsxəni verdilər, əslini yox*

**feignedly** ['feınıdlı] *adv* 1. yalandan, hiylə ilə; 2. saxta, süni, süni surətdə, yalan, riyakarlıqla, yanlış; qeyri-səmimi, ikiüzlülüklə

**feigner** ['feınəʳ] *n* 1. simulyant; hiyləgər, riyakar; 2. yalançı, iftiraçı, böhtançı, uydurmaçı; 3. saxtakar *(sənədi saxtalaşdıran)*

**feigningly** ['feınıŋlı] *adv* yalandan, hiylə ilə, riyakarlıqla

**feint**[1] [feınt] *n* 1. yalançılıq, hiyləgərlik, riyakarlaq, ikiüzlülük, sünilik; zahiri cəhət; **to make a ~ of doing *smth.*** özünü bir işlə məşğul olan kimi göstərmək; *His anger was but a feint Onun qəzəbi hiyləgərlik idi;* 2. yalan zərbə *(qılıncoynatmada, boksda)*, fənd *(rəqibi aldatmaq üçün edilən hərəkət)*

**feint**[2] [feınt] *adj* 1. yalançı, hiyləgər, riyakar, ikiüzlü, süni, uydurma, saxta; 2. qəlp, saxta, qondarma; yalan

**feint**[3] [feınt] *v* 1. yalan zərbə endirmək; yalançı hərəkət etmək; 2. *hərb.* yayındırıcı zərbə endirmək

**fell**[1] [fel] *n* I 1. dəri *(heyvanın);* 2. *d.d.* dəri *(insanın);* 3. saç; yun, qoyun yunu

**fell** [fel] *n* II 1. kəsmə, yarma, doğrama, çapma, qırma *(meşəni);* 2. bir mövsüm ərzində kəsilmiş/qırılmış/doğranmış ağac; 3. quzulama, quzu vermə

**fell**[2] [fel] *v* 1. kəsmək, yarmaq, doğramaq *(ağacı);* 2. yıxmaq, ayağını yerdən üzmək; **to ~ a man with a single blow** bir zərbə ilə adamı yerə yıxmaq/öldürmək; *The final attack of fever felled him Axırıncı dəfə qızdırma tutması onu öldürdü*

**fell**[3] [fel] **to fall** *felinin pt forması*

**fellah** ['felə] *n (pl* **-heen -s** [-z] fəllah *(ərəb ölkələrində oturaq əkinçi əhali)*

**feller** ['feləʳ] *n* odunçu, ağacqıran

**fellow**[1] ['felou] *n* 1. *d.d.* adam, insan, oğlan, gənc, cavan; yeniyetmə; kişi; **a ~** hər bir adam/insan; *A fellow can't work all day long Adam/İnsan bütün günü işləyə bilməz;* **good ~** gözəl oğlan; **jolly ~** şən içki /kef yoldaşı, zarafatçı; kompaniya/məclis adamı, əhli-kef oğlan; **queer ~** qəribə adam; **little ~** balaca oğlan; **poor ~** yazıq, fağır, bədbəxt, biçarə, zavallı; **old ~** qoca, qoca kişi; *Dost!/Dostum! (müraciət); My dear fellow Əzizim! Mənim əzizim;* 2. yoldaş, sənət / peşə yoldaşı; **~s at school** məktəb yoldaşları; **~s in arms** silah yoldaşları, silahdaşlar; **a ~ in crime**

cinayətin iştirakçısı; 3. aspirant, təqaüdçü; tədqiqat işi ilə məşğul olan; 4. kollecin / universitetin şura üzvü; 5. elmi cəmiyyətin həqiqi üzvü; **Fellow of the Royal Society** Kral Elmi Şurasının üzvü *(Böyük Britaniyada);* 6. qoşa / cüt şey, qoşa / cüt əşya, cüt, bir cüt; *I've found one shoe, but its fellow is missing Mən ayaqqabının bir tayını tapmışam, amma o biri yoxdur;* birisinə tay *(vəziyyətinə, rütbəsinə, qabiliyyətinə və s. görə); In his art he has no fellow Sənətində ona tay yoxdur;* 7. *amer. d.d.* cavan oğlan *(sevgili/adaxlı)*, pərəstişkar, aşiq; birgə/bir yerdə/ birlikdə yeyən;

◊ **to be (hail) ~ well met** hamı ilə dostluq münasibətində olmaq; *Stone dead hath no fellow at. söz. Ölü danışmaz*

**fellow**[2] ['felou] *adj* yoldaş; ~ **captive** əsirlik yoldaşı; ~ **employee** iş yoldaşı; ~ **student** tələbə yoldaşı; ~ **pupil** məktəb yoldaşı; ~ **worker** əməkdaş, iş yoldaşı; ~ **citizen** həmvətən, vətəndaş

**fellow-countryman** ['felou'kʌntrımən] *n* vətəndaş, yurddaş, həmvətən, həmşəhərli, həmyerli

**fellow-craftsman** ['felou'kra:ftsmən] *n* peşə / sənət yoldaşı

**fellow-creature** ['felou'kri:tʃə'] *n* qohum, yaxın adam

**fellow-feeling** ['felou'fi:lıŋ] *n* 1. hüsn-rəğbət; təvəccöh, simpatiya, rəğbət; **to have a ~ for** *smb.* bir kəsə hüsn-rəğbət göstərmək/rəğbət bəsləmək; 2. fikir/mənafe birliyi, qarşılıqlı anlaşma

**fellow-heir** ['felou'eə'] *n* ortaq vərəsə, miras şəriki

**fellowless** ['feloulıs] *adj* 1. yoldaşı olmayan; 2. *şair.* tayı/bərabəri olmayan, misilsiz, müqayisə edilməz, əla, çox gözəl

**fellowly**[1] ['feloulı] *adj* 1. *şair.* adamayovuşan, ünsiyyətli, mehriban; 2. yoldaşlıq hissi olan

**fellowly**[2] ['feloulı] *adv* 1. birgə, bir yerdə, birlikdə; bir bərabərdə, bir səviyyədə, bir təndə; 2. təklifsizcəsinə

**fellowship**[1] ['felouʃıp] *n* 1. yoldaşlıq, qardaşlıq; həmrəylik, birlik; ~ **of men** adamların/insanların qardaşlığı; cəmiyyət; 2. yoldaşlıq hissləri, dostluq münasibətləri; **good** ~ yaxşı münasibət; yoldaşlıq hissi; **long-standing** ~ çoxdankı/köhnə dostluq; 3. iştirak etmə, əli olma, əlbir olma, iştirak; ~ **in crime** *arx.* cinayətdə iştirak etmə/əli olma; 4. üzvlük *(elmi cəmiyyətdə və s.);* şura üzvünün elmi adı *(kollecdə, elmi cəmiyyətdə və s.);* 5. aspirantın təqaüdü/stipendiyası; elmi yaxud yaradıcılıq fəaliyyəti ilə məşğul olan adamlara verilən dotasiya; **to obtain a** ~ stipendiya / dotasiya almaq

**fellowship**[2] [felouʃıp] *v* 1. dini cəmiyyətin üzvlüyünə qəbul etmək; 2. dini cəmiyyətin üzvü olmaq

**fellow-soldier** ['felou'souldʒə'] *n* silahdaş, silah/polk yoldaşı, bir polkda qulluq edən, döyüşçü, müharibə yoldaşı

**fellow-subject** ['felou'sʌbdʒıkt] *n* vətəndaş, həmvətən, həmyerli, eyni dövlətin təbəəsi /vətəndaşı

**fellow-travel** ['felou'trævl] *n* 1. yol yoldaşı; 2. həmfikir *(siyasi partiyada)*

**felon**[1] ['felən] *n* I 1. *hüq.* cinayətkar, cani *(ağır cinayət törətmiş);* 2. yaramaz, alçaq, əclaf; şeytan, iblis

**felon** ['felən] *n* II *tib.* dolama

**felon**[2] ['felən] *adj arx. şair.* rəhmsiz, amansız, insafsız, qəddar, zalım, daşürəkli; cinayətkar; xain; xaincəsinə, satqıncasına; ~ **blow** xaincəsinə vurulan zərbə

**feloness** ['felənıs] *n hüq.* cinayətkar qadın/ qız, cani qadın / qız

**felony** ['felənı] *n hüq.* ağır cinayət; **to commit a** ~ ağır cinayət törətmək

**female**[1] ['fi:meıl] *n* 1. qadın cinsinə aid fərd, qadın; 2. *zool.* dişi, maya

**female**[2] ['fi:meıl] *adj* 1. qadın cinsindən olan, qadın; ~ **child** qız uşağı; ~ **relations** qohum qadınlar *(qızlar);* ~ **patients** pasient qadınlar / qızlar; 2. qadın; qadınlar üçün; ~ **education** qadın təhsili; ~ **weakness/charm** qadın zəifliyi/gözəlliyi; ~ **suffrage** qadınlar üçün seçki hüququ; 3. *arx.* arvadsifət, arvadaoxşar, zəif

**femality** [fı'mælıtı] *n* 1. qadınlıq; qadın xüsusiyyətləri; qadın təbiəti; 2. qadına bənzəyiş / oxşayış

**feminality** [.femı'nælıtı] *n* 1. *pl* qadın xüsusiyyətləri; qadın bəzəyi/zinəti/ bəzək-düzəyi, yaraşığı; 2. qadın incəliyi

**feminine** ['femının] *adj* 1. qadın, qadına xas olan; ~ **voice** qadın səsi; ~ **modesty** qadın təvazökarlığı; 2. arvadsifət, arvadaoxşar; 3. *qram.* qadın; ~ **gender** qadın cinsi

**femininity** [.femı'nınıtı] *n* 1. qadın incəliyi; 2. *top.i* qadınlar, qadın cinsi

**feminism** ['femınızm] *n* 1. feminizm *(*kapitalist *ölkələrində: qadınlara kişilərlə bərabər hüquq verilməsini tələb edən qadın hərəkatı)*; 2. *qadın xüsusiyyətləri; qadınlar tərəfindən işlədilən söz yaxud ifadə*

**feminist** ['femınıst] *n* feminist, feminizm tərəfdarı

**femur** ['fi:mə'] *n (pl* **femurs** *və ya* **femora)** *anat.* omba sümüyü

**fence**[1] [fens] *n* 1. çəpər, hasar, barı; **green** ~ yaşıl çəpər *(ağaclardan və kollardan sıx çəpər, hasar)*; **picket** ~ çəpər, çağ, paya çəpər; 2. *hərb.* məftil çəpər; hasarlama *(minalanmış sahəni);* 3. aerodinamik arakəsmə; 4. *id.* qılıncbazlıq, qılınc təlimi; **master of** ~ mahir qılıncbaz; 5. *jarq.* oğurlanmış əşyaları gizlədən möhtəkir; oğurluq əşyaların gizlədilməsi üçün məskən;

◊ *No fence against a flail / against ill fortune*



*arx.* ≅ *Taledən/Qismətdən qaçmaq mümkün deyil*; **to be on the other side of the ~** başqa düşərgədə olmaq, zidd fikrə tərəfdar olmaq; **to sit on the ~, to be / to ride on the ~, to straddle the ~** *amer.* bitərəfliyi saxlamaq; gözləmə mövqeyi tutmaq; **to come down on the right side of the ~** qalib gələnin tərəfini tutmaq / saxlamaq

**fence**[2] [fens] *v* 1. çəpərləmək, hasarlamaq (*həm də* **to ~ about/in/around**); **to ~ a town about with walls** şəhərin ətrafına divardan hasar çəkmək; *The house was fenced about with olive trees Ev zeytun ağacları ilə əhatə olunmuşdu;* **to ~ in machinery** maşınları qoruyucu hasarla dövrələmək; 2. qılıncbazlıq etmək; 3. birbaşa cavabdan yayınmaq; **to ~ with a question** suala cavab verməkdən boyun qaçırmaq; *Let's stop fencing around this proposition Gəl/Gəlin bu təklifin mahiyyətindən danışaq*; 4. müdafiə etmək, qorumaq; **to ~** ***one's*** **head from/against blows** başını zərbədən qorumaq/qaçırmaq; 5. maneənin üstündən atılmaq *(at haq.);* 6. *jarq.* oğurlanmış əşyaları gizlətmək; oğurlanmış əşyaların alveri ilə məşğul olmaq;

◊ **to ~ off/out** rədd/dəf etmək, qaytarmaq; qovmaq; özündən uzaqlaşdırmaq, başından çıxartmaq, unutmaq; **to ~ off the consequences** nəticədən qaçınmaq

**fenceless** ['fenslıs] *adj* 1. hasarsız, çəpərsiz, açıq, çəpərlənməmiş, hasarlanmamış; 2. müdafiə /mühafizə edilməyən, qorunmayan

**fence-month** ['fensmʌnθ] *n* = **fence-season**

**fence-play** ['fenspleı] *n* 1. diskussiya, müzakirə, mübahisə; 2. *tar.* qladiator döyüşləri

**fencer** ['fensə'] *n* 1. qılıncbaz; 2. qılıncbazlıq üzrə məşqçi; 3. mahir mübahisəçi; 4. hasarı tikən/düzəldən/təmir edən fəhlə; 5. maneələrlə keçirilən at yarışı; 6. *jarq.* oğurlanmış əşyaları gizlədən *(adam)*

**fence-season** ['fens.si:zn] *n* ov/balıq ovu qadağan olunan vaxt; bağlı mövsüm *(ov haq.)*

**fence-shop** ['fensʃɔp] *n jarq.* oğurlanmış şeylər satan dükan

**fence-sitting** ['fens.sıtıŋ] *n* bitərəf mövqe; gözləmə hərəkət tərzi; iki fikir yaxud qərar arasında tərəddüd etmə

**fencing** ['fensıŋ] *n* 1. çəpərləmə, hasarlama; 2. çəpər, hasar, barı; **iron** ~ dəmir hasar; **wire** ~ məftil çəpər/hasar; **the ~ of a farm** fermanı hasarlama; çəpər / hasar üçün material; 3. qılıncbazlıq; **to practice ~ / to go in for ~** qılıncbazlıqla məşğul olmaq; ~ **mask** qılıncbazlıq maskası; ~ **master** qılıncbazlıq müəllimi, qılıncbazlıq üzrə məşqçi; ~ **school** qılıncbazlıq məktəbi

**fend** [fend] *v* I **to defend** *felinin qısa forması*

**fend** [fend] *v* II 1. dəf etmək, qaytarmaq (*həm də* **to ~ off**); **to ~ off a blow** zərbəni dəf etmək, qaytarmaq; 2. yaxına buraxmamaq, yaxınlaşmağa qoymamaq, yanına buraxmamaq, qovmaq, özündən uzaqlaşdırmaq *(həm də* **to** ***~away/ from)***

**fender** ['fendə'] *n* 1. kamin/buxarı məhəccəri; 2. qoruyucu məhəccər *(tramvayda);* bufer mexanizmi; qanad *(avtomobildə)*

**fender-lamp** ['fendəlæmp] *n* avtomobildə fənərcik *(avtomobilin qabaq qanadı üstündə əlavə fənər)*

**fen-fire** ['fen.faıə'] *n* bataqlıq alovu *(gecələr bataqlıq yerlərdə görünən zəif alov)*

**fermail** ['fə:meıl] *n arx.* 1. düymə, ilgək; çarpaz, toqqa; 2. çərçivə, sağanaq

**ferment**[1] ['fə:ment] *n* 1. maya, acıtma, qıcqırtma; ferment; 2. həyəcan, çaxnaşma; *The country was in a ferment Bütün ölkə həyəcan /çaxnaşma içində idi*

**ferment**[2] [fə'ment] *v* 1. qıcqırmaq, turşumaq, acımaq, qıcqırmağa/turşumağa /acımağa səbəb olmaq; 2. həyəcanlandırmaq, təşvişə salmaq, narahat etmək, həyəcana gətirmək; həyəcana gəlmək, təşvişə düşmək, əsəbiləşmək, narahat olmaq; *Quick -spreading rumours fermented the city Sürətlə yayılan xəbər/şayiə şəhəri həyəcana gətirdi*

**fermentable** [fə'mentəbl] *adj* qıcqırma/turşuma / acıma qabiliyyətli, qıcqıra bilən

**ferocious** [fə'rouʃəs] *adj* 1. rəhmsiz, amansız, insafsız, qəddar, zalım, daşürəkli, vəhşi, çox sərt, qəzəbli; yırtıcı; ~ **animal** yırtıcı heyvan; ~ **look** qəzəbli baxış; 2. dəhşətli, qorxulu, qorxunc, müdhiş; çox şiddətli, son dərəcə; *The sunshine there would be ferocious at this time of year İlin bu vaxtında orada dəhşətli isti olar*

**ferociously** [fə'rouʃəslı] *adv* 1. rəhmsizcəsinə, amansızcasına, insafsızcasına, kobudcasına, acıqla, qeyzlə, qəzəblə, hiddətlə; vəhşicəsinə; **to glare at** ***smb.*** ~ gözünü qəzəblə/hiddətlə bir kəsə zilləmək; 2. olduqca, çox, həddən artıq, son dərəcə; dözülməz dərəcədə, son dərəcə bərk, şiddətli bir surətdə

**ferocity** [fə'rɔsıtı] *n* rəhmsizlik, amansızlıq, qəddarlıq, zalımlıq; yırtıcılıq, vəhşilik, sərtlik, azğınlıq

**ferreous** ['ferıəs] *adj* 1. dəmir, tərkibində dəmir olan; 2. dəmirə oxşayan *(bərkliyinə/ rənginə görə)*

**ferret** ['ferıt] *v* 1. *(***from, out of***)* qovmaq *(yuvadan həm də* **to ~ off***);* 2. axtarıb tapmaq, araşdırmaq, əlləşdirmək, eşələmək *(həm də* **to ~ about**); **to ~ about in** ***one's*** **pockets** cibini axtarmaq *(bir şey tapmaq məqsədilə);* **to ~ about among old documents** köhnə sənədlərin içində qurdalanmaq/əlləşmək

**ferrous** ['ferəs] *adj kim.* tərkibində ikivalentli dəmir olan; ~ **metal** qara metal

**ferrule**[1] ['feru:l] *n* 1. metal çənbər, sağanaq, çevrə, ucluq; 2. *hərb.* qoruyucu halqa; 3. *tex.* halqa, bilərzik

**ferrule²** [ˈferu:l] *v* metal çənbəri / halqanı taxmaq / geydirmək

**ferry¹** [ˈferı] *n* **1.** keçmə; keçid, gətirmə, aparma, daşıma; **to cross the ~** o biri sahilə keçmək; **to row *smb.* over the ~** bir kəsi o biri sahilə aparmaq/keçirmək *(qayıqla)*; **2.** bərə, sal; **to take the ~** bərə ilə keçmək; **3.** *av.* sürmə, sürülmə *(başqa yerə)*; **4.** müntəzəm hava nəqliyyatı xidməti; **the Transatlantic ~** transatlantik hava nəqliyyatı xidməti; **5.** *hüq. sərnişinlərin və yüklərin keçiddən daşınması və ona görə haqq alınma hüququ*

**ferry²** [ˈferı] *adj* bərə; **~ ticket** bərə bileti; **~ captain** bərə kapitanı

**ferry³** [ˈferı] *v* **1.** daşımaq, aparmaq *(qayıqla, bərə ilə; həm də* **to ~across/over)**; *Will you ferry me across? Məni o biri tərəfə aparırsan?/aparırsınız?*; **2.** *hərb.* daşımaq, aparmaq *(fizən vasitələrlə)*; **3.** *av.* hava ilə daşımaq; **4.** sürüb aparmaq *(təyyarələri)*

**ferry-boat** [ˈferıbout] *n* bərə *(çayda yük daşımaq üçün gəmi)*; daşıma vasitəsi

**ferryman** [ˈferımən] *n* bərəçi, salçı

**ferry service** [ˈferı.sə:vıs] *n* **1.** bərə xidməti; **2.** dənizlə daşıma xidməti

**fers** [fə:s] *n şahm. arx.* **1.** ferz, vəzir; **2.** keçici piyada

**fertile** [ˈfə:taıl] *adj* **1.** münbit, məhsuldar, bərəkətli; bol, çox, çoxlu, dövlətli, varlı, zəngin; **~ pastures** zəngin otlaqlar; **a race ~ in genius** istedadlarla zəngin xalq; **land ~ in natural resources** faydalı qazıntılarla bol/zəngin olan torpaq; **2.** məhsuldarlığa /münbitliyə /məhsul verməyə kömək edən; əlverişli; **~ climate** əlverişli iqlim

**fertility** [fə:ˈtılıtı] *n* **1.** münbitlik, məhsuldarlıq, bərəkət; **~ of soil** torpağın münbitliyi; **2.** bolluq, çoxluq, zənginlik; **~ of thought** fikir zənginliyi; **3.** *iqt.* optimal şəraitdə məhsuldarlıq *(torpaq haq.)*

**fertilizable** [.fə:tıˈlaızəbl] *adj* **1.** gübrə verilə bilən *(torpaq haq.)*; **2.** tozlanmağa yararlı

**fertilisation** [.fə:tılaıˈzeıʃn] *n* = **fertilization**

**fertilization** [.fə:tılaıˈzeıʃn] *n* **1.** gübrələmə, gübrələnmə *(torpaq haq.)*; **2.** *biol.* mayalanma; tozlama, tozlanma

**fertilize, -ise** [ˈfə:tılaız] *v* **1.** gübrələmək; münbitləşdirmək *(torpağı)*; **to ~ the intellect** zehni inkişaf etdirmək; **2.** *məc.* zənginləşdirmək; **3.** *biol.* münbitləşdirmək, məhsuldar etmək; tozlamaq *(bitki çiçəklərini)*

**fertilizer** [ˈfə:tılaızəʳ] *n* **1.** gübrələmə, gübrələnmə; gübrə; mineral gübrə; **2.** *biol.* tozlandırıcı; *Bees are good fertilizers Arılar yaxşı tozlandırıcıdırlar*; **~ grinder** *k.t.* mineral gübrələri xırdalayan / doğrayan cihaz

**ferver** [ˈfə:vəʳ] *n* = **fervour**

**fervour** [ˈfə:vəʳ] *n* **1.** isti, istilik, hərarət; qızğınlıq, həvəs, coşğunluq, ehtiras, dəliqanlılıq; **2.** qeyrət, səy, cəhd, şövq; **~ of the orator** natiqlik coşğunluğu; **~ of devotion** sadiqlik qeyrəti; **~ of love** məhəbbət ehtirası; **to greet with ~** ruh yüksəkliyi ilə/həvəslə/hərarətlə/coşğunluqla salamlamaq

**fester¹** [ˈfestəʳ] *n* **1.** irinləyən yara; **2.** irinləmə; irin

**fester²** [ˈfestəʳ] *v* **1.** irinləmək *(yara haq.)*; *The cut began to fester Kəsik yarası irinləməyə başladı*; **2.** əziyyət /əzab vermək, incitmək, iztirab vermək, üzmək

**festering** [ˈfestrıŋ] *n* irinləmə, irin, abses *(irinlik)*

**festival¹** [ˈfestıvl] *n* **1.** bayram, təntənə, şənlik; şadyanalıq; qonaqlıq; **harvest ~** məhsul bayramı; **to hold/to keep/to make ~** bayram etmək/keçirtmək; əylənmək, kef çəkmək; *Christmas is Christians festival Milad xristianların bayramıdır*; **2.** festival *(incəsənət bayramı)*; **The World Youth ~** Ümumdünya Gənclər Festivalı; **film ~** kinofilm festivalı

**festival²** [ˈfestıvl] *adj* bayram; **~ dress** bayram paltarı/libası; **a ~ atmosphere** bayram şəraiti /mühiti

**festive** [ˈfestıv] *adj* **1.** bayram; təntənəli, təmtəraqlı; bayramsayağı, sevinc, sevincli, şad, şən, şux, xoştəbiət; **~ evening** təntənəli /təmtəraqlı gecə; **the ~ season** dini bayram/milad bayramı günləri *(xristianlarda milad günündən xaçaçırana qədər olan günlər)*; **to gather round the ~ board** bayram stolunun/masasının arxasında toplaşmaq; **to be in ~ mood** bayram əhval-ruhiyyəsində/ovqatında olmaq; **2.** ədəbsiz, qaba, kobud, diliuzun, utanmaz, sırtıq, abırsız, həyasız *(məktəb jarqonu)*

**festively** [ˈfestıvlı] *adv* təntənəli, təmtəraqlı, bayramsayağı, şən, şad, şadyana, sevinc, sevincək; sevinə-sevinə

**festivity** [fesˈtıvıtı] *n* **1.** şadlıq, şənlik, nəşə; əyləncə; təntənə, təmtəraq; bayram, şən əhval-ruhiyyə; *Festivity is in the air Hər yanda bayram əhval-ruhiyyəsi hiss olunur*; **2.** *əsas. pl* bayram, təntənə, şənlik; şadyanalıq; qonaqlıq; **Christmas festivities** Milad şənlikləri; **to take part in the festivities** şənliklərdə iştirak etmək

**fetch¹** [fetʃ] *n* I **1.** hiylə, kələk, biclik, fənd, hiyləgərlik; **every little ~ of wit** ağlın / zehnin hər bir hiyləsi; **to cast a ~** tor qurmaq; **2.** səy, cəhd, qeyrət; **to take a ~** böyük səy göstərmək; **far/long ~** uzun/dolama yol; **3.** çətin nəfəs alma, spazma *(boğazda)*

**fetch** [fetʃ] *n* II xəyal, kölgə, qarabasma, kabus; oxşar *(bir adamın oxşarı, bir-birinə eynən oxşayan iki nəfərdən biri)*

**fetch²** [fetʃ] *v* **1.** gedib... gətirmək; **to go and ~ a doctor** gedib həkim gətirmək; *Fetch me a glass of water Get/Gedin mənə bir stəkan su gətir/gətirin; Will you fetch the children from school? Zəhmət olmasa, gedib uşaqları məktəbdən gətir!/ gətirin!; Come and fetch him on your way home Evə gedərkən yolda onun dalınca get/gedin; Will you fetch me from the theatre? Sən/Siz mənim dalımca teatra gələrsənmi?/ gələrsinizmi?* **2.** səbəb olmaq *(göz yaşlarına və s.)*; **to ~ a laugh from the audience** tamaşaçıların gülüşünə səbəb olmaq; **to ~ tears from the eyes** gözlərin yaşarmasına səbəb olmaq; **3.** almaq, çıxartmaq, buraxmaq; **to ~ a deep sigh** dərindən nəfəs almaq; **to ~ a dreadful groan** dəhşətli zarıltı çıxartmaq; **4.** *d.d.* endirmək, vurmaq *(zərbə)*; **to ~ *smb.* a blow on the head** bir kəsin başına zərbə vurmaq/endirmək; **5.** *d.d.* cəlb /cəzb /heyran/valeh/məftun etmək; **to ~ the audience** tamaşaçıları valeh/heyran etmək; *That will fetch him! Bu onu valeh edəcək*;

◊ **to ~ about** dolayı yolla hərəkət etmək; **to ~ away** zorla çıxmaq, canını qurtarmaq, qurtulmaq, xilas/azad olmaq; **to ~ down 1)** yıxmaq, vurub yıxmaq, öldürmək, həlak etmək; **2)** *məc.* sarsıtmaq, belini sındırmaq; **to ~ down *one's* opponent** rəqibini sarsıtmaq/vurub yıxmaq

**fetcher** [ˈfetʃəʳ] *n* **1. ~ and carrier** xidmətçi, qulluqçu, nökər; buyruq qulu; **2.** *amer.* cazibə, şirnikdirici şey; tələ yemi, yem; *That was a fetch he couldn't resist O bu cür şirnikdirici şeyə dözə bilmədi*

**fetching** [ˈfetʃıŋ] *adj d.d.* cəlbedici, cazibədar, cazibəli, məlahətli, heyranedici, çox gözəl/qəşəng; şirnikdirici; **a ~ girl** qəşəng /məlahətli/ cazibədar qız

**fetish** [ˈfi:tıʃ] *n* **1.** büt, sənəm, fetiş, həmail, dua, gözmuncuğu, tilsim; **2.** pərəstişgah, qibləgah; **to make a ~ of *smth.*** bir şeyi fetişləşdirmək; **to make a ~ of the past** keçmişi ideallaşdırmaq; **2.** *tar. bütpərəstlərin ecazkar adətləri və dini nəğmələri*

**fetisher** [ˈfi:tıʃəʳ] *n* cadugər, sehrbaz, ovsunçu, gözbağlayıcı, ara həkimi, türkəçarəçi

**fetishism** [ˈfi:tıʃızm] *n* fetişizm *(***1)** *bütpərəstlik, bütlərə sitayiş;* **2)** *məc. bir şeyə kor-koranə sitayiş etmə)*

**fetishist** [ˈfi:tıʃıst] *n* **1.** bütpərəst; **2.** bir şeyə kor-koranə sitayiş edən adam

**fetish-man** [ˈfi:tıʃmən] *n (pl* **-men** [-mən] **1.** cadugər, sehrbaz, ovsunçu, gözbağlayıcı; **2.** bütpərəst, bir şeyə kor-koranə sitayiş edən adam

**fettle¹** [ˈfetl] *n* vəziyyət, hal, əhval; **in good ~** yaxşı vəziyyətdə, əla formada *(fiziki cəhətdən)*; **in fine/ splendid ~** yaxşı/əla əhvali-ruhiyyədə

**fettle²** [ˈfetl] *v* **1.** qaydaya salmaq, düzəltmək, təmir etmək; **2.** bəzəmək, zinət /bəzək vermək, zinətləndirmək

**fettler** [ˈfetləʳ] *n* təmir fəhləsi; **road ~** yol fəhləsi, yol təmir edən fəhlə

**fetus** [ˈfi:təs] *n* meyvə, bar, bəhər; döl; rüşeym, embrion

**feud** [fju:d] *n* ədavət, düşmənçilik; çəkişmə; **blood ~** qan düşmənçiliyi; **to be at ~ with *smb.*** bir kəslə qatı düşmənçilik etmək

**feudal¹** [ˈfju:dl] *adj* I düşmən, düşməncəsinə, qan düşməni

**feudal²** [ˈfju:dl] *adj* II feodal; **~ lord** feodal *(feodalizm dövründə: iri torpaq sahibi, təhkimçi, mülkədar)*; **~ system** feodalizm, feodalizm quruluşu/sistemi

**feudalism** [ˈfju:dəlızm] *n* feodalizm, feodalizm quruluşu

**feudalist** [ˈfju:dəlıst] *n* **1.** feodal; feodalizm quruluşunun tərəfdarı; **2.** feodalizm tarixi üzrə mütəxəssis

**fever¹** [ˈfi:vəʳ] *n* **1.** isti, istilik, qızdırma, hərarət, qızdırmalı vəziyyət; *He has a high fever Onun yüksək qızdırması var; Has he any fever? Onun temperaturu/qızdırması varmı?* **jungle ~** cəngəllik qızdırması; **yellow ~** sarı qızdırma; **brain ~** beyin iltihabı; **scarlet ~** skarlatin *(adət. uşaqları tutan yoluxucu xəstəlik)*; *Aspirin can reduce fever Aspirin qızdırmanı sala bilir*; **2.** yatalaq; **spotted ~** səpmə yatalaq; **typhoid ~** qarın yatalağı; **3.** əsəb oyatma, həyəcan, həyəcanlandırma, təlaş; **to be in a ~** əsəbi vəziyyətdə olmaq; **to send /to throw *smb.* into a ~ of excitement/of joy** bir kəsi bərk həyəcanlandırmaq/sevindirmək; *He was waiting for the girl's arrival in a fever of impatience O, qızın gəlməsini böyük bir təlaşla gözləyirdi;*

◊ **gold ~** qızıl həyəcanı; **train ~** qatara gecikmək təlaşı/qorxusu; **stage ~** səhnəyə çıxma qorxusu/təlaşı

**fever²** [ˈfi:vəʳ] *v* hərarətə/qızdırmaya səbəb olmaq; qızdırmaq, titrədib qızdırmaq, isitmək

**fevered** [ˈfi:vəd] *adj* qızdırmalı; həyəcanlı

**feveret** [ˈfi:vərıt] *n* yüngül qızdırma/titrəmə

**fever-heat** [ˈfi:vəhi:t] *n* **1.** *tib.* qızdırma, yüksək temperatur; **2.** gərginliyin/həyəcanın yüksək nöqtəsi; *The excitement rose to fever-heat Həyəcan yüksək nöqtəyə çatdı*

**feverish** [ˈfi:vərıʃ] *adj* **1.** qızdırmalı; *The patient is feverish Xəstə qızdırmalıdır*; **~ symptoms** qızdırma əlamətləri; *The child's forehead feels feverish Uşağın alnında qızdırma əlaməti var.* **~ dreams** sayıqlama; sərsəmləmə; **2.** sağlam olmayan, səhhət üçün yaramayan *(iqlim, yerlər haq.)*; **a damp ~ spot** rütubətli /yaş /səhhət üçün yaramayan yer; **3.** həyəcanlandırılmış, həyəcanlı, dəyişkən; **a ~ condition of the stock market** birjada dəyişkən vəziyyət; **4.** boğanaq, bürkülü, bürkü, isti; ağır; *The day was feverish Gün bürkülü idi*

**feverishly** [ˈfi:vərıʃlı] *adv* qızğın surətdə, həyəcanlı, təlaşlı, həyəcanlı vəziyyətdə

**few¹** [fju:] *n* **1.** bir para/bəzi adamlar, bəziləri, kiçik/cüzi/az miqdar; *Few of the inhabitants were to be seen Ancaq cüzi miqdarda sakinləri görmək mümkün oldu; There are very few of us Biz*

*çox azıq;* 2. **the** ~ azlıq; seçmə / imtiyazlı adamlar; **the thinking** ~ düşünən azlıq; **the fortunate** ~ bir neçə xoşbəxtlər/bəxtəvərlər;
◊ **in** ~ bir neçə sözlə, qısaca

**few²** [fju:] *adj* 1. bir para, bəzi, bir az, bir qədər, bir balaca, az; *He has but few chances of success Müvəffəqiyyət üçün onun şansı azdır;* **during the last** ~ **days / years** son bir neçə gün / il ərzində; *Few people are able to understand him Az adamlar onu başa düşməyə qadirdir;* 2. az, bir ovuc; kiçik; *Such occasions are few Belə hallar çox azdır; His friends are few Onun dostları azdır*

**fewness** ['fju:nıs] *n* sayca azlıq; kiçiklik

**fewtrils** ['fju:trılz] *n pl* əhəmiyyətsiz /cüzi / mənasız / boş şeylər

**fiance** [fi'a:nseı] *n fr.* nişanlı, adaxlı *(oğlan)*

**fiancee** [fi'a:nseı] *n fr.* 1. gəlin; 2. adaxlı / nişanlı qız

**fib¹** [fıb] *n* I *d.d.* 1. uydurma, qondarma, yalan; **to tell** ~**s** yalan danışmaq, bir az üstünə qoyub danışmaq, gop etmək; 2. yalançı, iftiraçı, böhtançı, boşboğaz, gopçu

**fib** [fıb] *n* II *d.d.* zərbə; **to give a** ~ zərbə vurmaq/endirmək

**fib²** [fıb] *v* I *d.d.* uydurmaq, qondarmaq, düzəltmək, quraşdırmaq, yalan danışmaq, bir az üstünə qoymaq, gop etmək

**fib** [fıb] *v* II *d.d.* zərbələr yağdırmaq *(boksda)*

**fibre¹** ['faıbə^r] *n* 1. lif, fibra *(sıxılmış möhkəm və elastiki kağız kütləsi);* 2. tel *(sap şəklində olan şey);* **wool /silk / flax** ~ yun / ipək / kətan lif; **glass** ~ şüşə lif; **muscle** ~ əzələ lifi; 3. xarakter, xarakter tərzi; **a man of fine/coarse** ~ zərif / kobud adam; ~ **silk** süni ipək

**fibre²** ['faıbə^r] *adj* lifli; ~ **crops** lifli bitkilər

**fibreboard** ['faıbə'bɔ:d] *n* fibradan düzəldilmiş karton

**fibred** ['faıbəd] *adj* lifli, tel-tel

**fibrillate** ['faıbrıleıt] *v* laxtalanmaq *(qan haq.)*

**fibrillated** ['faıbrıleıtıd] *adj* lifli struktura / quruluşa malik olan; lifli, tel-tel

**fibrillation** [.faıbrı'leıʃn] *n* 1. laxtalanma *(qan haq.);* 2. lifli kütlə

**fibrin** ['faıbrın] *n fiziol.* fibrin *(qanın laxtalanmış zülalı)*

**fibrination** [.faıbrı'neıʃn] *n tib.* qanda fibrinin qeyri-normal miqdarı

**fibroma** [faı'broumə] *n (pl* **-ta**) *tib.* fibroma *(birləşdirici toxumalardan əmələ gələn zərərsiz şiş)*

**fibrous** [faı'brouz] *adj* lifli *(birləşdirici toxumalardan ibarət olan)*

**fibrosis** [faı'brouzıs] *n (pl* **-ses**) *tib.* fibroz *(bədənin hər hansı bir orqanında birləşdirici lifli toxumanın inkişaf etməsindən ibarət olan patoloji proses; lifli toxumaların törəməsi)*

**fictile** ['fıktaıl] *adj* 1. gildən qayrılmış, saxsı; ~ **deity** gildən qayrılmış büt; 2. dulusçu *(saxsı qab qayıran);* ~ **art** dulusçuluq sənəti

**fictility** ['fıktılıtı] *n* 1. suvaşqanlıq, qatılıq, yapışqanlıq; 2. dulusçuluq məmulatı

**fiction** ['fıkʃn] *n* 1. *ədəb.* belletristika *(nəsrlə yazılan bədii ədəbiyyat; romanlar, hekayələr),* bədii ədəbiyyat; **works of** ~ romanlar, povestlər *(roman süjetindən daha sadə süjetli bədii əsərlər);* **to write / to read** ~ bədii əsər yazmaq/ oxumaq; *He prefers history to fiction O, tarixi belletristikadan üstün tutur;* 2. uydurma, əfsanə, qondarma; yalan, yalan-palan; fiksiya; **to distinguish fact from** ~ faktı uydurmadan/əfsanədən fərqləndirmək; 3. *hüq.* fiksiya; **legal** ~ / ~ **of law** hüquqi fiksiya

**fictional** ['fıkʃənl] *adj* 1. uydurulmuş, uydurma, qondarma, qondarılmış, yalan; 2. belletristika

**fictioneer** [.fıkʃə'nıə^r] *n* məhsuldar romançı

**fictioner** ['fıkʃənə^r] *n* = **fictionist**

**fictionist** ['fıkʃənıst] *n* belletrist *(belletristik əsərlər yazan yazıçı),* romançı, roman yazan

**fiction-monger** ['fıkʃn.mʌŋgə^r] *n d.d.* 1. uydurmaçı, qondarmaçı, yalançı, iftiraçı; böhtançı, boşboğaz, gopçu; 2. xəbərçi, sözgəzdirən, qeybətçi, dedi-qoduçu

**fictitious** [fık'tiʃəs] *adj* 1. uydurulmuş, uydurma, qondarma, təsəvvür edilən; ~ **being** uydurulmuş məxluq; ~ **characters** uydurulmuş şəxslər/personajlar *(dramatik və ya ədəbi əsərdə iştirak edən şəxs);* ~ **narrative** uydurma, əfsanə, qondarma, yalan, yalan-palan; ~ **name** uydurma ad; 2. yalan, yalançı, süni, saxta; ~ **marriage** saxta nikah/kəbin; ~ **tears** yalançı/süni göz yaşları; ~ **fame** süni/yalançı şöhrət

**fiddle¹** ['fıdl] *n* 1. *d.d.* skripka, simli çalğı aləti; 2. tutmaq / həbs etmək üçün order *(müəyyən əməliyyat aparmaq və ya bir şey almaq üçün yazılı əmr / sənəd);* 3. *jarq.* yalan, hiylə, kələk, fırıldaq;
◊ **a face as long as a** ~ hüznlü sifət; **to play first** ~ əsas rol oynamaq; **to play second** ~ ikinci dərəcəli rol oynamaq

**fiddle²** ['fıdl] *v* 1. *d.d.* skripka çalmaq; 2. əlində oynatmaq; *He fiddled with the pipe until he broke it O, qəlyanını qırana qədər əlində oynatdı; Don't fiddle with the device Cihaza əl vurma!/vurmayın!* **to** ~ **about** boş-bikar gəzmək, heç bir iş görməmək, tənbəllik etmək, veyllənmək, avara gəzmək; *I spent the whole day fiddling about Mən bütün günü buralarda veyllən-dim/boş-boş gəzdim/avaralandım*

**fiddle-case** ['fıdlkeıs] *n* skripka üçün futlyar *(qab, qutu, çexol)*

**fiddler** ['fıdlə^r] *n* 1. skripkaçı, skripka çalan *(əsas. küçədə);* 2. *jarq.* yalançı, adamaldadan;
◊ **to play the** ~ 1) hesablaşmaq, haqq-hesabı üzmək; 2) cavabdeh olmaq, məsuliyyət daşımaq

**fiddle-string** ['fıdlstrıŋ] *n* skripka simi

**fidelity** [fı'delıtı] *n* 1. düzlük, doğruluq, sədaqət, vəfa, loyallıq; ~ **to** *one's* **principles** prinsipləri-



nə sədaqət; prinsipiallıq, prinsiplilik; 2. dəqiqlik, düzgünlük, doğruluq; **the** ~ **of the translation** tərcümənin düzgünlüyü/doğruluğu

**fidget¹** ['fıdʒıt] *n* 1. *pl* həyəcan, iztirab; təlaş, nigaranlıq, təşviş, narahatlıq, narahat vəziyyət; qərarsızlıq; **to give** *smb.* **the** ~**s** *d.d.* bir kəsi əsəbiləşdirmək; **to have the** ~**s/to be in a** ~ narahat olmaq, əsəbiləşmək; 2. əsəbi, narahat, qərarsız adam, bir yerdə oturmayan / qərar tutmayan adam

**fidget²** ['fıdʒıt] *v* 1. narahat olmaq, hərlənmək, fırlanmaq, qurdalanmaq, yerində rahat oturmamaq; **to** ~ **with** *smth.* bir şeylə oynamaq; *Stop fidgeting with your pen! Qələmlə oynama!/oynamayın!;* 2. həyəcana gəlmək, təşvişə düşmək, əsəbiləşmək, narahat olmaq, vurnuxmaq, boş-boşuna əlləşmək, çapalamaq, fikrini toplamağa aciz olmaq; *Hurry up, your father is fidgeting! Tələs/Tələsin, atan/ atanız narahatdır!; She says that I fidget her to death O deyir ki, mən onu çox əsəbiləşdirirəm/lap cana gətirirəm*

**field¹** [fı:ld] *n* 1. tarla, zəmi, əkin yeri; düzənlik, çöl, sahə; çəmən, otlaq; ~ **of wheat** taxıl zəmisi/tarlası; **flowers/beasts of the** ~ çöl güllə-ri/heyvanları; ~ **of ice** buz sahəsi; ~**s of snow** qar sahəsi; 2. meydança, aerodrom *(hər hansı məqsəd üçün);* **flying** ~ uçuş meydanı; aerodrom; **auxiliary** ~ yardımçı aerodrom; 3. *id.* meydan; **athletic** ~ stadion, idman meydanı; **jumping** ~ tullanmaq üçün zolaq; *The teams are coming on to the field Komandalar meydana çıxırlar;* 4. *id.* oyunçular/yarış iştirakçıları; **to bet/to back/to lay against the** ~ mərc çəkmək, bəhsləşmək, çəkişmək, ortaya pul qoymaq, banka pul atmaq *(cıdırda at üçün); Were you among field? Sən/Siz iştirakçılar arasında idin/idiniz?;* 5. *geol.* yataq; **diamond/ gold** ~**s** almaz/qızıl mədənləri/ yataqları; 6. döyüş meydanı; **to take / to keep the** ~ hərbi əməliyyata başlamaq/ əməliyyat aparmaq; **to lose the** ~ döyüşü uduzmaq; **to pitch / to set a** ~ döyüş meydanını seçmək; **to withdraw from the** ~ döyüş meydanından geri çəkilmək; 7. döyüş, savaş; **a hard-fought** ~ amansız döyüş/ savaş; **to win the** ~ döyüşü/savaşı udmaq; **to enter the** ~ döyüşə/mübarizəyə başlamaq *(yarışda);* 8. sahə, fəaliyyət sahəsi; ~ **of action** fəaliyyət sahəsi; **a wide** ~ **for trade** ticarət üçün geniş fəaliyyət; *He is the best man in his field O öz sahəsində ən yaxşı mütəxəssisdir; This is not my field Bu mənim sahəm deyil;* 9. dairə, sahə; ~ **of view / of vision** görüş dairəsi / sahəsi; **magnetic** ~ maqnit sahəsi

**field²** [fı:ld] *v* 1. topu qəbul etmək *(kriket oyununda);* 2. açıq havada qurutmaq *(taxıl və s.);* 3. ortaya pul qoymaq *(cıdırda at üçün),* mərc çəkmək/gəlmək

**field-allowance** ['fı:ldə'lauəns] *n hərb.* 1. döyüş təchizatı norması; 2. çöl işlərinə görə artım

**field and track** ['fı:ldənd'træk] *n id.:* ~ **athletics** yüngül atletika; ~ **man** yüngül atlet

**field-artillery** ['fı:lda:'tılərı] *n* səhra və ya yüngül artilleriya

**field-battery** ['fı:ld'bætərı] *n* səhra artilleriya batareyası *(bir neçə top və ya minaatanlardan ibarət hissə)*

**field-bed** ['fı:ldbed] *n* 1. səyyar çarpayı; 2. torpaq üzərində yataq / yataq yeri

**field-book** ['fı:ldbuk] *n* döyüş jurnalı/kitabı

**field-day** ['fı:lddeı] *n* 1. *hərb.* manevr *(sülh şəraitində hərbi qüvvələrin döyüşə hazırlığını yoxlamaq üçün taktik məşğələlər);* səhrada taktik məşğələlər; meydana çıxma/çıxış; 2. atletik yarışlara / ova həsr olunmuş gün; 3. unudulmaz gün

**field-duty** ['fı:ld.dju:tı] *n hərb.* döyüşən orduda xidmət

**fielded** ['fı:ldıd] *adj* 1. döyüşən, döyüş meydanında olan; 2. qəbul olunmuş *(kriket oyununda top)*

**field-engine** ['fı:ld.endʒın] *n* traktor, lokomobil *(buxarla işləyən və başqa maşınları hərəkətə gətirən motor)*

**field-events** ['fı:ldı'vents] *n pl id.* idman yarışları *(qaçış zolağından kənarda);* idmanın yüngül atletika üzrə növləri *(tullama, tullanma, atma)*

**field-glass** ['fı:ldgla:s] *n* səhra durbini, binokl

**field-gun** ['fı:ldgʌn] *n* səhra topu

**field-hand** ['fı:ldhænd] *n* 1. kənd təsərrüfatı fəhləsi; muzdur; 2. *tar.* qul *(plantasiyada),* kölə *(əsas. amerikan zəncilər haq.)*

**field-handball** ['fı:ld'hændbɔ:l] *n id.* əl topu

**field-hospital** ['fı:ld'hɔspitl] *n* 1. səyyar hospital / hərbi xəstəxana, lazaret *(hərbi xəstəxana);* 2. sanitar maşını

**field-kitchen** ['fı:ld'kıtʃın] *n hərb.* səyyar mətbəx

**Field-Manual** ['fı:ld'mænjuəl] *n* döyüş nizamnaməsi/təlimatı

**Field-marshal** ['fı:ld'ma:ʃl] *n* feldmarşal *(çar ordusunda və bəzi xarici ordularda yüksək hərbi rütbə)*

**field-meeting** ['fı:ld'mi:tıŋ] *n* duel

**field-night** ['fı:ldnaıt] *n* unudulmaz/məşhur gecə

**field-piece** ['fı:ldpi:s] *n (yüngül)* səhra topu

**field-practice** ['fı:ld.præktıs] *n hərb.* səhra taktik məşğələləri

**field-sports** ['fı:ldspɔ:ts] *n pl* ovçuluq *(balıq ovu və s.)*

**field-telephone** ['fı:ld'telıfoun] *n* səhra telefonu

**field-trial** ['fı:ld.traıəl] *n* səhra sınaqları; səhra şəraitində sınaqlar

**fierce** [fıəs] *adj* 1. şiddətli, azğın, kəskin, sərt, qəddar, dəhşətli, dözülməz; ~ **dog** sərt it; ~ **competition** kəskin rəqabət; 2. şiddətli, bərk, sərt; ~ **tempest** şiddətli tufan; ~ **heat** dəhşətli isti; 3. *amer. jarq.* dözülməz, çox pis; *The weather was fierce Hava çox pis/dözülməz idi*

**fiercely** ['fıəslı] *adv* 1. sərt, vəhşicəsinə, qəddarcasına, amansızcasına, insafsızcasına, bərk; 2. qə-

zəblə, hiddətlə, acıqla, şiddətlə, azğın bir halda, şiddətli; 3. qızğın, alovlu, atəşin; hərarətlə
**fiery** ['faɪərɪ] *adj* 1. odlu, alovlu, atəşin, qızğın, qızmar, coşğun, ehtiraslı; **the ~ gulf of Etna** odpüskürən Etna krateri *(vulkan ağzı)*; **~ sun** qızmar günəş; **~ eyes** odlu/ehtiraslı gözlər; **~ speeches** atəşin / hərarətli/qızğın nitqlər; 2. hirsli, tezqızışan, tez özündən çıxan, əsəbi, tez hirslənən; **~ disposition** tündməcaz xarakter
**fife**[1] [faɪf] *n* tütək; kiçik fleyta *(nəfəsli musiqi aləti)*
**fife**[2] [faɪf] *v* tütəkdə / fleytada çalmaq
**fifer** ['faɪfəʳ] *n* fleytaçalan, tütəkçalan
**fifteen** ['fɪf'ti:n] *n* 1. *(say)* on beş; *Fifteen and fifteen make thirty On beş üstə gəl on beş otuz eylər*; 2. *(nömrə)* on beş, on beşinci nömrə; **chapter ~** on beşinci fəsil *(kitabda)*; **Room ~** on beş nömrəli otaq; 3. on beş; **in ~s** on beş-on beş *(hər birində)*; 4. on beş *(yaş haq.)*; *He is fifteen Onun on beş yaşı var*; **at ~** on beş yaşında; **a girl of ~** on beş yaşlı qız; 5. on beş nəfərdən/oyunçudan ibarət qrup/dəstə; 6. *(həm də* **rugby ~***) id.* reqbi komandasının on beş oyunçusu; **~ men** on beş adam; *Fifteen twos are thirty İki dəfə on beş otuz edir*; **~ times as much** on beş dəfə çox
**fifteenth** ['fɪf'ti:nθ] *adj* 1. on beşinci *(sıra sayı)*; *He is in his fifteenth O, on beş yaşının içindədir*; 2. **(the ~)** on beşinci *(gün, tarix, vaxt)*; **on the ~ of May** mayın on beşində
**fifth**[1] [fɪfθ] *adj* 1. beşinci *(sıra sayı)*; *He is in his fifth year O, beş yaşının içindədir*; **~ form** beşinci sinif *(məktəb)*; *He is doing it for the fifth time O bunu beşinci dəfə edir*; 2. **(the ~)** beşinci *(gün, tarix, vaxt)*; **on the ~ of May** mayın beşində; *You are the fifth to ask me about it Sən / Siz bu haqda məndən soruşan beşinci adamsan / adamsınız*;
**fifth**[2] [fɪfθ] *adv* beşinci; *He arrived fifth O, beşinci gəldi*
**fifties** ['fɪftɪz] *n pl* 1. əllidən altmışa qədər; 2. **(the ~)** əllinci illər *(əsrdə)*; 3. əllidən altmışa qədər yaş; *She is in the early / in the late fifties Onun yaşı əlli beşdən artıqdır/azdır*
**fig**[1] [fɪg] *n* I 1. əncir; əncir ağacı; **green ~s** təzə əncir; 2. = **fig-tree**
**fig** [fɪg] *n* II *d.d. kob.* 1. şiş *(birisinə istehza və ya sataşmaq üçün əlini yumruq kimi yumub, baş barmağını şəhadət barmağı ilə orta barmaq arasından çıxarıb göstərmə)*; 2. boş/əhəmiyyətsiz/cüzi şey; xırda, xırda şey, xırda-xuruş;
◊ *I don't care /give a fig/a fig's end for it Tüpürüm ona, Heç vecimə deyil*; **to value smb. a ~** bir kəsi saymamaq, bir kəsi adam yerinə qoymamaq
**fig** [fɪg] *n* III 1. geyim, paltar; parad kostyumu/paltarı; axşam paltarı *(qadın üçün)*; **in full ~** bəzənib-düzənmiş halda; **to be dressed full ~** qəşəng geyinmək/geyinib-kecinmək; 2. vəziyyət, əhval-ruhiyyə, ovqat; **to be in good ~** yaxşı ovqatda/ əhval-ruhiyyədə olmaq

**fig**[2] [fɪg] *v* bəzəmək; geyindirmək, geyindirib-kecindirmək
**fight**[1] [faɪt] *n* 1. döyüş, müharibə, vuruşma, savaş; 2. *hərb.* hərbi əməliyyatlar; **hand-to-hand ~** əlbəyaxa vuruşma; **~ in retreat** döyüşə-döyüşə geri çəkilmə; **to start the ~** döyüşə/vuruşa başlamaq; savaşmaq, dalaşmaq; **to make a poor ~ of it** zəif müqavimət göstərmək; **to put up a good ~** mərdcəsinə/cəsarətlə vuruşmaq; 3. mübarizə; **finish ~** *amer.* axıra qədər mübarizə; **to carry on a stubborn ~ against *smb.*** bir kəsə qarşı inadla mübarizə aparmaq/ döyüşmək; 4. döyüş ruhu; ehtiras, çoşğunluq, qızğınlıq; hərarət; *He had still some fight in him Onda hələ döyüş ruhu var*; **to put some ~ into *smb.*** bir kəsi ürəkləndirmək/ruhlandırmaq; **to show ~** döyüşə hazırlıq nümayiş etdirmək
**fight**[2] [faɪt] *v (pt, pp* **fought** [fɔ:t]) 1. döyüşmək, vuruşmaq, müharibə etmək; **to ~ for *one's* country** vətəni/yurdu uğrunda vuruşmaq /müharibə etmək; **to ~ a duel** dueldə vuruşmaq; **to ~ a bout** döyüş keçirmək *(boks)*; **to ~ desperately** qoçaqcasına / fədakarcasına vuruşmaq; **to ~ like a lion** şir/aslan kimi vuruşmaq/ döyüşmək; 2. mübarizə aparmaq; **to ~ against disease** xəstəliyə qarşı mübarizə aparmaq; **to ~ a fire** yanğınla mübarizə aparmaq, 3. müdafiə etmək, tərəfdar olmaq *(mübarizədə)*; **to ~ a case/an action** işi müdafiə etmək *(məhkəmədə)*; **to ~ back** müqavimət göstərmək; **to ~ down** qalib gəlmək
◊ **to ~ *one's* way in life** həyatda özünə yol açmaq
**fighter** ['faɪtəʳ] *n* 1. döyüşçü, əsgər; mübariz; 2. qırıcı təyyarə; **~ aircraft/plane** qırıcı təyyarə; **~ aviation** qırıcı aviasiya/ təyyarələr; **~ bomber** qırıcı-bombardmançı təyyarə; 3. hücumçu (1) *alçaqdan uçaraq yerdəki hədəflərə hücum edən hərbi təyyarə*; 2) *bu cür təyyarəni idarə edən təyyarəçi)*
**fighting**[1] ['faɪtɪŋ] *n* 1. döyüş, vuruşma; **hand-to-hand ~** əlbəyaxa döyüş; **street ~** küçə döyüşləri; **house-to-house ~** hər ev uğrunda döyüş; **~ at close quarters** yaxın məsafədə döyüş *(boksda)*; 2. güləşmə, qurşaq tutma
**fighting**[2] ['faɪtɪŋ] *adj* mübariz, döyüşkən; hərbçi, davakar; **~ speech** müharibəyə/ mübarizəyə aid olan nitq; **~ policy** davakar siyasət;
◊ **to be on ~ terms with *smb.*** bir kəslə qanlıbıçaq olmaq / düşmənçilik etmək
**fightingly** ['faɪtɪŋlɪ] *adv* hirslə, acıqla, qeyzlə
**fighting-mad** ['faɪtɪŋmæd] *adj* döyüş həsrətində olan, döyüş dəlisi
**fig-leaf** ['fɪglɪ:f] *n (pl* **-leaves** [-lɪ:vz] 1. *(heykəltəraşlıqda çılpaq bədənlərin tənasül üzvlərini örtən yarpaq təsviri)*;2. *məc.* ədəbsiz bir iş və hərəkətin üstünü riyakarcasına pərdələmə
**figurable** ['fɪgjurəbl] *adj* plastik, elastik, asan-



lıqla əyilə bilən; istənilən şəklə salına bilən, sınmayan
**figural** ['fɪgjurəl] *adj* = **figurative**
**figurate** ['fɪgjureɪt] *adj* istənilən şəklə malik olan, hər hansı bir fiqur şəklində olan
**figurative** ['fɪgjurətɪv] *adj* 1. məcazi; **in a ~ sense** məcazi mənada; 2. metaforik, bədii; **~ style** bədii üslüb; **~ writer** metaforadan geniş istifadə edən yazıçı; 3. təsviri; **~ arts** təsviri incəsənət
**figuratively** ['fɪgjurətɪvlɪ] *adv* metaforik, məcazi, bədii surətdə; məcazi olaraq
**figure**[1] ['fɪgəʳ] *n* 1. rəqəm; **double/three/ four ~s** ikirəqəmli / üçrəqəmli / dördrəqəmli ədədlər; **in round ~s** bütöv/tam rəqəmlərlə; 2. *pl d.d.* hesab; **to be smart/ quick at ~s** yaxşı/sürətlə saymaq/hesablamaq; **to be a poor hand at ~s** hesabı pis bilmək; 3. diaqram, şəkil, rəsm, çertyoj *(kitabda)*; *See figure 2 on page 5 Beşinci səhifədə ikinci şəklə bax / baxın!* 4. fiqura, xarici görkəm; bədən quruluşu; zahiri görünüş; *He was a fine figure of a man Onun əla bədən quruluşu vardı; The girl had a nice slender figure Qızın gözəl qaməti var idi*; 5. şəxs, adam, sima, şəxsiyyət; *He was one of the greatest figures of his age O, öz dövrünün ən məşhur adamlarından biri idi*; **public ~** ictimai xadim; **a person of ~** məşhur şəxsiyyət; 6. fiqur *(rəqsdə, buz üzərində fiqurlu sürüşmədə/pilotajda)*; 7. *d.d.* qiymət; **to buy at a high / at a low ~** yüksək / aşağı qiymətə almaq
**figure**[2] ['fɪgəʳ] *v* 1. təsvir etmək *(qrafik olaraq)*; 2. təsəvvürə gətirmək; təsəvvür etmək; *How do you figure it to yourself Sən/Siz bunu necə təsəvvür edirsən/edirsiniz?*; 3. *amer. d.d.* hesab /güman etmək, qiymətləndirmək; *I figure that it will take three years Hesab edirəm ki, buna üç il lazım olacaq*; 4. simvol/rəmz olmaq *(simvol/rəmz vəzifəsini görmək)*, təsvir etmək; 5. olmaq, iştirak etmək, adı çəkilmək, rol oynamaq; *His name figures on the list Onun adı siyahıda var; He will certainly figure in history O, şübhəsiz, tarixə düşəcək*; 6. rəqəmlərlə göstərmək; 7. *d.d.* saymaq, hesablamaq; 8. fiqur göstərmək *(rəqsdə, fiqurlu sürüşmədə və s.)*; **to ~ on** bir şeyə ümid olmaq; **to ~ on a success** 1) müvəffəqiyyətə ümid olmaq; 2) nəzərə almaq; **to ~ out** hesablamaq, hesablayıb tapmaq; **to ~ out the expense** 1) xərcləri hesablamaq; 2) başa düşmək, anlamaq, dərk etmək; *I couldn't figure out what he was going to do Başa düşə bilmədim, o nə etmək fikrində idi/istəyirdi*
**figured** ['fɪgəd] *adj* naxışlı, güllü, bəzəkli; fiqurlu; **~ silk** naxışlı ipək
**figure-skater** ['fɪgə.skeɪtəʳ] *n* fiqurist *(buz üzərində mürəkkəb fiqurlar göstərən idmançı)*
**figure-skating** ['fɪgə.skeɪtɪŋ] *n* buz üzərində fiqurlu sürüşmə

**figurine** ['fɪgjuri:n] *n* heykəlcik, kiçik heykəl, fiqurcuq, kiçik fiqur
**filatory** ['fɪlətərɪ] *n* əyirici maşın
**filature** ['fɪlətʃəʳ] *n* 1. ipək əyirmə; 2. ipəkəyirmə fabriki
**filch**[1] [fɪltʃ] *n* 1. xırda oğurluq; 2. oğurlanmış əşya
**filch**[2] [fɪltʃ] *v* oğurlamaq, çırpışdırmaq; **to ~ a book out of a library** kitabxanadan kitab çırpışdırmaq/oğurlamaq
**filcher** ['fɪltʃəʳ] *n* xırda şeylər oğrusu
**file**[1] [faɪl] *n* I 1. əyə, törpü; çilingər mişarı; **to touch a piece up with a ~** bir şey mişarlamaq/əyələmək 2. *d.d.* hiyləgər, kələkbaz, aferist, bic; **an old ~** cüvəllağı; **deep ~** qatı fırıldaqçı
**file** [faɪl] *n* II 1. kağıztikən papka; baş sancağı, sancaq; şpilka *(kağız sancmaq/taxmaq üçün)*; 2. tikilmiş sənədlər/kağızlar; *Do we have your application on file? Sən /Siz artıq ərizə vermisən?/ vermisiniz?* 3. dəst *(qəzet haq)*; **a ~ of the "Times"** "Tayms"-ın dəsti; 4. iş, dosye *(bir işə və ya məsələyə aid bütün sənəd və materiallar)*; 5. kartoteka (1) *müəyyən sistem üzrə yığılmış kartoçkalar*; 2) *bu kartoçkaları saxlamaq üçün yeşiklər)*; **to place *smth.* on the ~s** bir şeyi kartotekalara daxil etmək
**file**[2] [faɪl] *v* I 1. mişarlamaq; 2. əyə/törpü ilə cilalamaq; **to ~ a saw** mişarı itiləmək; **to ~ away, to ~ down, to ~ off** 1) mişarlamaq; 2) *məc.* cilalamaq, pardaqlamaq
**file** [faɪl] *v* II 1. müəyyən ardıcıllıqla saxlamaq/tikmək *(qəzeti və s.)*; **to ~ letters in alphabetical order** məktubları əlifba sırası ilə düzmək; 2. *amer.* sənədləri təqdim etmək; **to ~ a petition** ərizə vermək; **to ~ a resignation** istefaya çıxmaq haqqında ərizə vermək
**file-cabinet** ['faɪl.kæbɪnət] *n* kartoteka
**filer** ['faɪləʳ] *n* I 1. kağıztikən papka, qeydçi *(idarəyə daxil olan və çıxan kağızları dəftərə qeyd edən qulluqçu)*; 2. kargüzar
**filer** ['faɪləʳ] *n* II *jarq.* cibkəsən, cibgir
**filial** ['fɪljəl] *adj* 1. oğulluq; qızlıq; **~ duty / respect/obedience** oğulluq, qızlıq borcu/ ehtiramı/itaəti; **~ love** oğulluq/qızlıq məhəbbəti; uşaqların valideynlərə məhəbbəti; 2. filial; **~ branch** yerli şöbə, filial
**filicide** ['fɪlɪsaɪd] *n* 1. uşaq qatili, uşaq öldürən; 2. uşaq qatilliyi, uşaqları öldürmə
**filigrane** ['fɪlɪgreɪn] *n* = **filigree**
**filigree** ['fɪlɪgri:] *n* filiqran *(qızıl, gümüş və başqa metal tellərdən hörülmüş şeylər /zərgərlik şeyləri)*; çox incə/nəfis iş; **~ baskets** filiqran səbətlər
**filigreed** ['fɪlɪgri:d] *adj* 1. filiqran *(şəbəkəli nazik metal tellərdən hörülmüş)*; 2. zərgərlik, 3. *məc.* çox nazik / incə/nəfis
**filing** ['faɪlɪŋ] *n* 1. sistemləşdirilmə, sistemləşdirmə, sistemə salınma *(sənədləri arxivdə)*; 2. tikmə, tikilmə *(qəzetləri)*; **~ system** tikmə ardıcıllığı / sistemi; **~ clerk** kargüzar; **~ cabinet** sənədlərin saxlanılması üçün şkaf

**flag-man** ['flægmən] *n hərb.* siqnalçı, siqnal verən *(bayraqla)*
**flag-officer** ['flæg.ɔfisə'] *n* admiral; komandan *(admiral rütbəsində)*
**flagpole** ['flægpoul] *n* bayraq ağacı, siqnal dirəyi
**flag-rank** ['flægrænk] *n dən.* admiral rütbəsi
**flag-root** ['flægru:t] *n amer. d.d.* şəkər qamışının kökü; şəkər qamışı
**flagship** ['flægʃip] *n dən.* flaqman gəmisi
**flagstaff** ['flægsta:f] *n* bayraq ağacı
**flag-tower** ['flægtauə'] *n dən.* siqnal qülləsi
**flake**[1] [fleik] *n* 1. topa, yığın; **a ~ of snow** qar topası/yığını; 2. *pl* lopa, yumaq; 3. qəlpə, qırıntı, qırıq, parça; yonqar; **soap ~s** sabun yonqarı; **a ~ of stone** daş qırıntısı; 4. qat, lay, sıra, cərgə, səf
**flake**[2] [fleik] *v* 1. lopa-lopa/quşbaşı düşmək /tökmək/yağmaq; 2. laylara ayırmaq; lay-lay etmək; 3. *mac.* təbəqələrə ayırmaq, təbəqələşdirmək
**flam**[1] [flæm] *n* yalan, uydurma, cəfəngiyyat, hədərən-pədərən, gop
**flam**[2] [flæm] *v amer.* aldatmaq, ələ salmaq, oynatmaq, axmaq yerinə qoymaq
**flame**[1] [fleim] *n* 1. alov; **in ~s** alov içində, alovlanan; **to burst/to break into ~(s), to go up in ~s** alışmaq, od tutmaq, yanmaq, alışıb yanmaq; **to commit to the ~s** odlamaq, yandırmaq; **to shoot out ~s** alov püskürmək; 2. parlaq işıq, şəfəq, parıltı; şölə, nur; **silver ~ of moonlight** ayın gümüşü işığı/nuru/şöləsi; **the ~s of sunset** qürub şəfəqi/qızartısı; 3. coşğunluq, qızğınlıq, hərarət, dəliqanlılıq; qeyrət; ehtiras, böyük həvəs /maraq; **~ of anger/ indignation** qəzəb / hiddət coşğunluğu; **to fan the ~** ehtirasları qızışdırmaq
**flame**[2] [fleim] *v* 1. alovlanmaq, alışmaq, od tutub/alışıb yanmaq, şölələnmək; 2. şəfəq /işıq /nur saçmaq, parıldamaq, işıq vermək, parlamaq; *The western sky flamed Qərbdə səma alışıb yanırdı;* 3. od tutmaq, od almaq, od tutub yanmaq *(ehtiraslar və s. haq.);* **to ~ with indignation** qəzəbdən / hiddətdən od tutub yanmaq; **to ~ out** od almaq / tutmaq, yanmaq
**flame-arrester** ['fleimə.restə'] *n* qığılcım tutan *(bacalardan və s.-dən qığılcımın çıxmasına mane olan qurğu / tor)*
**flame-colour** ['fleim.kʌlə'] *n* qırmızı-sarı və ya narıncı rəng
**flame-engine** ['fleim.endʒin] *n* qazla işləyən motor/mühərrik; qaz motoru/mühərriki
**flameless** ['fleimlis] *adj* 1. alovsuz, alovsuz yanan; 2. ehtirassız, soyuq, həvəssiz, şövqsüz
**flame-proof** ['fleimpru:f] *adj* alovadavamlı, odadavamlı, alovlanmayan, alovlana bilməyən
**flame-thrower** ['fleim.θrouə'] *n* odsaçan *(silah)*, alovsaçan *(silah)*
**flaming** ['fleimiŋ] *adj* 1. alovlanan, alışan, şölələnən, od tutub yanan; yanan, od tutmuş, alışmış, yanar; **~ gun** *hərb.* odsaçan *(silah)*; 2. parlaq; şölələnən, alovlanan, alovlu; **~ colours** parlaq boyalar; **~ sunset sky** gün batan çağı şölələnən səma; 3. isti; **~ August** isti avqust; **~ sun** yandırıcı/ çox isti günəş; 4. hərarətli, odlu, alovlu, coşğun, qızğın, ehtiraslı; **~ speaker** ehtiraslı /alovlu/coşğun natiq
**flamingly** ['fleimiŋli] *adv* parlaq surətdə; aydınaçıq; 2. hərarətlə; ehtirasla, ruh yüksəkliyi ilə, coşğunluqla
**flammable** ['flæməbl] *adj* tez alovlanan, tez od tutan; tez alışan / yanan
**flank**[1] [flæŋk] *n* 1. böyür, yan tərəf; tərəf; **~ wind** yan tərəfdən əsən külək; 2. eniş, yamac, dağın döşü; qanad *(binada)*; 3. *hərb.* cinah; **to attack on the ~** cinahdan hücum etmək; **~ attack** cinahdan hücum
**flank**[2] [flæŋk] *v* 1. yanda/yan tərəfdə yerləşmək; *Big fir trees flanked the house Evin yan tərəfində hündür küknar ağacları vardı;* 2. *hərb.* cinahda olmaq/yerləşmək; 3. yanaşı / qonşu / yaxın / bitişik olmaq; həmsərhəd olmaq; *The fort flanked on the swamp İstehkam bataqlıqda yerləşmişdi;* 4. cinahdan ötüb keçmək; cinahlardan uzununa atəş açmaq
**flanked** [flæŋkt] *adj hərb.* cinahlardan qorunan
**flanker**[1] ['flæŋkə'] *n hərb.* cinahı qoruyan istehkam
**flanker**[2] ['flæŋkə'] *v* 1 cinahlarda istehkam xətti düzəltmək, cinahları müdafiə vasitələri ilə təmin etmək; 2. *hərb. arx.* cinaha hücum etmək
**flanking** ['flæŋkiŋ] *adj hərb.* cinah, cinahdan; cinahlardan uzununa açılan; **~ attack** cinah hücumu; **~ fire** cinahdan açılan atəş
**flare**[1] [fleə'] *n* 1. parıltı, işıltı, şəfəq, bərq; 2. odlanma, alışma; alov dili; 3. *mac.* partlayış, gurultu, səs; **a sudden ~ of trumpets** trubaların qəfil səsi; **a sudden ~ of anger** qəzəbin qəfildən coşması; 4. işıq siqnalı; 5. işıqlandırıcı fişəng; siqnal fişəngi; 6. *d.d.* lovğalıq, gopçuluq
**flare**[2] [fleə'] *adj* işıqverən; **~ bomb** işıqverən bomba; **~ parachute** işıqverən paraşüt
**flare**[3] [fleə] *v* 1. parıldamaq, işıldamaq, şəfəq saçmaq; 2. alışmaq, od almaq/tutmaq; 3. hirslənmək, acıqlanmaq, özündən çıxmaq, hiddətlənmək *(həm də* **to ~ up**); 4. siqnal/işarə vermək; 5. *mac.* xəbər/məlumat vermək, xəbərdar etmək *(işıqla və s.)*
**flash**[1] [flæʃ] *n* 1. işıq, parlaq işıq; **a ~ of lightning** şimşəyin işığı; 2. coşma; parlaq təzahür, ifadə *(hisslərin, əhval-ruhiyyənin və s.);* **a ~ of hope** ümid işığı; **a ~ of merriment** şənliyin qızışması/coşması; 3. an, ləhzə, göz qırpımı, qırpım; **in a ~** bir anda, dərhal, göz açıb yumunca / qırpınca; **to have** ***smth.*** **for a ~** qısa vaxt ərzində bir şeyə malik olmaq; 4. *d.d.* süni gözəllik, qəşənglik, parlaqlıq; 5. lovğalıq, gopçuluq, özünü öymə; gopçu, özünü öyən / tərifləyən *(adam)*;
◊ **~ in the pan** müvəffəqiyyətsizlik, boşa çıxma, baş tutmayan cəhd; iflas, müvəffəqiyyətsizliyə uğramış/uğursuz adam



**flash**[2] [flæʃ] *adj d.d.* 1. qəşəng, əlvan, parlaq, diqqəti cəlb edən, gözəçarpan; qeyri-adi, qəribə *(paltar və s. haq);* zövqsüz, ucuz; **~ hotel** qəşəng mehmanxana; 2. qəlp, saxta; süni; **~ jewelry** süni daş-qaş, cavahirat; **~ coin/notes** saxta sikkə/banknotlar; 3. oğru; **~ language** oğru dili/jarqonu; **~ term** oğru jarqonunda işlənən söz; 4. qəfildən; tez baş verən və ötüb keçən/ sovuşan; **~ fire** qəflətən baş verən yanğın
**flash**[3] [flæʃ] *v* 1. alışmaq, od tutmaq/almaq; parlaq işıq saçmaq; parıldamaq, işıldamaq, şəfəq saçmaq/vermək; *The lightning flashed across the sky Səmada şimşək çaxdı/parladı;* 2. qəfildən işıqlandırmaq; bir şeyin üstünə cəld parlaq işıq yönəltmək; **to ~ a lantern in** ***smb.'s*** **eyes** fənər işığını bir kəsin gözlərinə yönəltmək; **to ~ light with a mirror** güzgü ilə ləkə *(inikas edən günəş şüasından şeyin üstünə düşən parlaq ləkə)* salmaq; **to ~ a glance/a look at** ***smb.*** bir kəsə ani nəzər salmaq; **to ~ a smile at** ***smb.*** bir kəsə ani təbəssüm bəxş etmək; 3. parlayıb / yanıb sönmək, sayrışmaq, birdən görünüb yox olmaq; arabir görünmək/nəzərə çarpmaq, sürətlə keçmək / getmək; sürətlə keçib getmək; *The express flashed through the station Ekspress stansiyadan sürətlə keçib getdi; Time flashed by Vaxt tez keçdi;* 4. qəflətən xəyala / fikrə gəlmək; gəlmək *(fikir, güman və s. haq.); It flashed upon me Birdən ağlıma gəldi; The idea flashed across/ through / into my mind Bu fikir birdən ağlıma gəldi;* 5. təcili xəbər vermək *(teleqrafla, radio ilə); The news was flashed next day all over England Ertəsi gün xəbər ildırım sürətilə bütün İngiltərəyə yayıldı*
**flash-flood** ['flæʃflʌd] *n* qəfildən daşqın, subasma *(yağışlardan sonra)*
**flash-house** ['flæʃhaus] *n jarq.* qumarxana, tiryəkxana, məskən, yuva
**flash-light** ['flæʃlait] *n* 1. siqnal işığı; mayakın parıldayan işığı; parlaq titrəyən işıq *(işıq reklamlarının və s.);* 2. elektrik cib fənəri
**flashy** ['flæʃi] *adj* 1. zahiri, süni, yalançı; gözə çarpan, diqqəti cəlb edən, qeyri-adi, qəribə *(paltar və s. haq.);* **~ dress** diqqəti cəlb edən paltar; alabəzək, zövqsüz paltar; **~ manners** utanmaz ədalar; **~ jewels** kobud / yöndəmsiz bəzək-düzək *(broşka, üzük və s.);* 2. qısa müddətli; ani, fövri; 3. *d.d.* coşğun, kəskin, sərt; səbirsiz, hövsələsiz, təmkinsiz, özünü saxlaya bilməyən; **~ temper** tez özündən çıxma, hövsələsiz/ səbirsiz xarakter
**flask**[1] [fla:sk] *n* 1. mehtərə *(çiyindən asılan su qabı);* böyük butulka; **vacuum ~** termos; kolba *(kimya təcrübələrində işlədilən darboğazlı şüşə qab);* 2. barıt qabı; 3. *tex.* qəlib qutusu *(tökmə sənayesində)*
**flask**[2] [fla:sk] *v* 1. mehtərəyə / butulkaya tökmək; 2. tökmək *(barıtı)*
**flat**[1] [flæt] *n* I 1. yastılıq, düzlük, düz səth; **the ~ of the hand** ovuc, ovucun/əlin içi; 2. tiyənin ağzı/iti tərəfi; kənarı, sərhəd; 3. düzənlik, düzəngah, düz yer; dayaz yer; alçaq sahil; 4. yastıdibli qayıq; barja; 5. enli dayaz səbət; 6. *pl* dabansız tufli
**flat** [flæt] *n* II 1. mənzil *(eyni mərtəbədə yerləşən);* **block of ~s** çoxmənzilli ev; 2. *pl* bu cür bir neçə mənzildən ibarət olan ev
**flat**[2] [flæt] *adj* I 1. yastı, düz, hamar; **~ roof** yastı dam; **as ~ as a pancake** tamamilə düz/yastı; **~ nose** yastı burun; 2. yastısına; yanı / böyrü / dalı üstə; **to fall ~ on the ground** yerə böyrü üstə yıxılmaq; **to knock** ***smb.*** **~** bir kəsin ayağını yerdən üzmək; 3. qabarıq olmayan, düz; 4. dayaz; **~ dish /pan** dayaz boşqab / tava; 5. yastıdibli *(gəmi haq.);* 6. dabansız, alçaq dabanlı *(ayaqqabı haq.)*
**flat** [flæt] *adj* II 1. darıxdırıcı, usandırıcı, ürəksıxan, cansıxıcı, maraqsız; süst, cansız, ölüvay, ləng, həvəssiz; birtonlu, yeknəsəq, 2. yorucu; **~ speech** maraqsız/yorucu nitq; *Life is very flat in a small village Kiçik kənddə həyat çox yeknəsəqdir; We all feel very flat now that he has gone O gedəndən sonra biz çox darıxırıq;* 3. şit, bayağı *(zarafat haq.); His joke fell flat Onun zarafatı bayağı/yersiz oldu;* 4. ləng *(ticarət və s. haq.);* 5. pis əhval-ruhiyyədə, pərt, məyus, dilxor, ruhdan düşmüş, düşgün; 6. ətrini/dadını /gücünü/tündlüyünü itirmiş/dadsız *(pivə, qazlı, sü və s. haq.); The meal is too flat Yemək tamam dadsızdır/ şitdir;* 7. havası buraxılmış, boşalmış *(şin haq.);* **to go ~** havanı buraxmaq *(şin haq.);* **~ tire** havası buraxılmış şin
**flat** [flæt] *adj* III açıq, aydın, qəti, bəzi; **~ decision** qəti qərar; **~ failure** açıq uğursuzluq; **~ nonsense** xalis/sırf cəfəngiyyat; **to give a ~ denial** qəti etiraz etmək; *That's flat Bu, qətidir, Bu mənim sonuncu sözümdür*
**flat-boat** ['flætbout] *n* yastıdibli qayıq
**flat-bottomed** ['flæt'bɔtəmd] *adj* yastıdibli
**flat-fish** ['flætfiʃ] *n* 1. yastı balıq; 2. *zool.* kambala; qalxan balığı *(gözləri başının bir tərəfində olan yastı balıq)*
**flat-foot** ['flætfut] *n* 1. yastı ayaq *(ayaq nöqsanı)*; 2. *jarq.* dənizçi, matros
**flat-footed** ['flæt'futid] *adj* 1. ayaq altının yastı olmasından əziyyət çəkən; 2. yastıdibli; 3. hərəkətsiz *(oyunçu haq.)*;
◊ **to catch ~** cinayət başında tutmaq
**flat-iron**[1] ['flæt'aiən] *n* ütü
**flat-iron**[2] ['flæt.aiən] *v* ütüləmək, ütü çəkmək
**flatly** ['flætli] *adv* 1. qəti, qəti surətdə; **to refuse ~** qəti imtina etmək; 2. darıxdırıcı, cansıxıcı, maraqsız, cansız, ölü halda; 3. yastı, düz, hamar
**flatten** ['flætn] *v* 1. yastılatmaq, düz/hamar /yastı

etmək, qırışıqları/bürüşükləri düzəltmək/açmaq; hamarlamaq; hamarlayıb düzəltmək; əritmək; **to ~ the seams** tikiş yerini ütüləmək; *Time flattens the mountains Zaman dağları da əridir;* **to ~ oneself against a wall** divara bərk sıxılmaq; **to ~ under a load** ağır yük altında çökmək; **2.** sakitləşmək, zəifləşmək, azalmaq, kəsilmək *(külək, tufan haq.)*; **3.** yıxmaq; ayağını yerdən üzmək; *The hurricane flattened the trees Qasırğa ağacları yıxdı;* **4.** *id.* nokaut etmək, nokautla sıradan çıxarmaq/məğlub etmək; **5.** basmaq, basıb şikəst etmək; basıb sındırmaq/əzmək; basıb öldürmək; *The car flattened the hen Avtomobil toyuğu basıb yastıladı;* **6.** *d.d.* məğlub/darmadağın etmək; *The senator flattened his opposition Senator rəqibini məğlub etdi;* **7.** *d.d.* var-yoxdan çıxarmaq, iflasa səbəb olmaq; *The depression flattened many small businesses Depressiya çoxlu kiçik firmaları var-yoxdan çıxardı/iflasa uğratdı*

**flatter** [ˈflætəʳ] *v* **1.** yaltaqlanmaq, yaltaqlıq etmək, üzə gülmək; həddindən artıq tərifləmək; *You flatter me! Sən/Siz məni həddindən artıq tərifləyirsən/tərifləyirsiniz;* **to ~ smb.'s vanity** bir kəsin şöhrətini həddən artıq tərifləmək; *I feel flattered by your invitation Sənin / Sizin dəvətini / dəvətinizi almaq mənim üçün fərəhlidir;* **2.** bəzəmək, şişirtmək; *The portrait flattered her O, portretdə həyatdakından gözəldir*

**flatterer** [ˈflætərəʳ] *n* yaltaq

**flat-ware** [ˈflætweəʳ] *n* **1.** yemək ləvazimatları *(bıçaq, çəngəl, qaşıq)*; **2.** xırda və ya dayaz qab-qacaq

**flavor** [ˈfleɪvəʳ] *n amer.* = **flavour**

**flavorous** [ˈfleɪvərəs] *adj* **1.** ətirli; **2.** dadlı, tamlı; xoşagələn tamı olan

**flavour[1]** [ˈfleɪvəʳ] *n* ətir; xoşagedən iy/qoxu /dad/ təm; ətir, xoş iy *(şərabın, çayın)*; **~ of food** yeməyin iyi

**flavour[2]** [ˈfleɪvəʳ] *v* **1.** xörəyə dadverən şey qatmaq *(ağartı, ədviyyat və s.)*; dad/iy vermək; **to ~ soup with onions** supa soğan vurmaq/tökmək; **2.** dadmaq, dadına baxmaq, dadını bilmək; **3.** **(of)** dada/təmə /iyə malik olmaq

**flavoured** [ˈfleɪvəd] *adj* **1.** şirə qatılmış / ədviyyat vurulmuş, tünd, kəskin; **~ with** *smth.* bir şey qatılmış/vurulmuş; ətirli; xüsusi dadı/təmi olan; **2.** ətirləndirilmiş

**flavourless** [ˈfleɪvəlɪs] *adj* **1.** dadsız, təmsiz, şit; **2.** iysiz, qoxusuz

**flaw[1]** [flɔ:] *n* **1.** çat, çatlamış yer, yarıq *(cavahiratda, şüşədə, farforda)*; qüsur, çat *(metalda)*; **2.** zədə, nöqsan; ayıb; **3.** *hüq.* səhv, xəta, nöqsan *(sənəddə və s.)*

**flaw[2]** [flɔ:] *v* **1.** çatlatmaq, çatlamaq; korlamaq, xarab etmək; korlanmaq; **2.** *hüq.* etibarsız etmək

**flawless** [ˈflɔ:lɪs] *adj* nöqsansız, qüsursuz; eyibsiz, ləkəsiz, təmiz; çox gözəl/yaxşı, əla, kamil, mükəmməl, ayıbsız

**flawy** [ˈflɔ:ɪ] *adj* nöqsanlı/qüsurlu/eybi olan

**flea[1]** [fli:] *n* **1.** birə; **2.** = **flea-beetle**; **3.** qırmızımtıl-qəhvəyi rəng;
◊ *Nothing must be done hastily but killing of fleas Tələsmək ancaq birələri öldürərkən lazımdır*

**flea[2]** [fli:] *v* birələrdən canını qurtarmaq; birələrdən təmizləmək

**flea-beetle** [ˈfli:ˌbi:tl] *n* **1.** xırda yer / torpaq birəsi; **2.** yarpaq böcəyi

**flea-bite** [ˈfli:baɪt] *n* birə sancması/dişləməsi

**flee** [fli:] *v (pp, pt* **fled** [fled]) **1.** qaçmaq, qaçıb getmək, canını qurtarmaq, xilas olmaq; **to ~ the country** ölkədən qaçmaq; *The enemy fled in disorder Düşmən nizamsız halda qaçdı;* **to ~ from** *íle's* **temptation** tamahını/nəfsini saxlamaq; **2.** *məc.* getmək, keçmək, keçib getmək, ötüb keçmək; *Life had fled Həyat ötüb keçmişdi*

**fleece[1]** [fli:s] *n* qoyun yunu; **fine thick ~** qalın zərif qoyun yunu

**fleece[2]** [fli:s] *v* **1.** qoyun qırxmaq; **2.** zorla/ hədələməklə pul qopartmaq/almaq; **to ~a person of all his money** zorla/qorxutma yolu ilə bir kəsin bütün pullarını almaq; ≅ bir kəsi qaz kimi yolmaq

**fleecy** [ˈfli:sɪ] *adj* **1.** yunla örtülmüş; **2.** yunaoxşar, yun kimi; xovlu, yumşaq; **a coat with a warm ~** isti xovu olan palto; **~ snow** yumşaq qar; **~ hair** gur yumşaq saç

**fleer[1]** [flɪəʳ] *n* I qaçaq, qaçqın

**fleer** [flɪəʳ] *n* II **1.** nifrət ifadə edən baxış/ nəzər, istehzalı təbəssüm; **2.** rişxənd, ələ salma, lağa qoyma

**fleer[2]** [flɪəʳ] *v* **1.** nifrətlə gülümsəmək/gülümsünmək / qımışmaq; **2.** ələ salmaq, masqaraya/lağa qoymaq, istehza / rişxənd etmək

**fleet[1]** [fli:t] *n* **1.** donanma, flot; **the ~** hərbi donanma; **Admiral of the Fleet** donanma admiralı *(Britaniyada hərbi-dəniz rütbələrindən ən yüksəyi)*; **a ~ in being** hərbi əməliyyata hazır donanma; **mercantile ~** ticarət donanması; **air ~** hava donanması, aviasiya; **2.** flotiliya (1) *müəyyən çayda, göldə, qapalı dənizdə olan bütün hərb gəmiləri;* 2) *gəmi dəstəsi)*; **fishing ~** balıq ovlayan flotiliya; **a ~ of whalers** kit/ balina ovlayan flotiliya; **3.** park *(avtomobillər, traktorlar və s. üçün)*;
◊ **~ of the desert** səhra gəmiləri, dəvə karvanı

**fleet[2]** [fli:t] *adj* **1.** tez, iti, cəld, sürətli; **~ of foot** itiayaq, qaçağan, itigedən, ayaqdan yüngül/zirək; **~er than the wind** küləkdən iti sürətli; **2.** *şair.* tezkeçən, tezötən, tezsovuşan

**fleet[3]** [fli:t] *v* **1.** tez keçmək/ötmək/sovuşmaq; **2.** sürüşmək; **3.** *arx.* vaxt keçirmək; **4.** *dən.* mövqeyini dəyişmək

**Fleet Street** [ˈfli:tˈstri:t] *n* **1.** Flitstrit *(Londonda qəzetlərin redaksiyalarının cəmləşdiyi küçə)*; **2.** *məc.* dövri mətbuat *(qəzet-jurnal)*



**flesh[1]** [fleʃ] *n* **1.** bədən, əndam, vücud; ət; **in ~** kök, ətli-canlı; **to make / to gain / to put on/to pick up ~** kökəlmək, yoğunlaşmaq; **to loose ~** arıqlamaq; *Wolves live on flesh Canavarlar ətlə qidalanırlar / yaşayırlar;* **2.** ehtiras, nəfs, şəhvət; **sins of the ~** şəhvani günah/qəbahət; **to mortify the ~** ehtirası öldürmək; **3.** insan nəsli

**flesh[2]** [fleʃ] *v* **1.** qan dadızdırmaqla ova öyrəşdirmək *(iti, şahini)*; qana hərislik/yırtıcılıq oyatmaq; **2.** qılıncı qana boyamaq *(ilk dəfə)*; **3.** kökəltmək, kökəlmək; **4.** lətini təmizləmək

**flesh-bird** [ˈfleʃbə:d] *n* yırtıcı/leşyeyən quş

**flesh-brush** [ˈfleʃbrʌʃ] *n* masaj şotkası

**flesh-colour** [ˈfleʃˌkʌləʳ] *n* ət rəngi

**flesh-coloured** [ˈfleʃˌkʌləd] *adj* ət rəngli/rəngində

**flesh-eating** [ˈfleʃˌi:tɪŋ] *adj* yırtıcı, ətyeyən; **~ birds** yırtıcı/ətyeyən quşlar

**flesh-fly** [ˈfleʃflaɪ] *n* ət milçəyi

**flesh-glove** [ˈfleʃglʌv] *n* masaj üçün əlcək

**flesh-hook** [ˈfleʃhuk] *n* ət asılan qarmaq

**fleshing** [ˈfleʃɪŋ] *n* **1.** dərini ətdən ayırma; **2.** qan dadızdırmaqla ova öyrəşdirmə *(iti, şahini)*

**fleshless** [ˈfleʃlɪs] *adj* **1.** ətsiz, əti olmayan; **2.** arıq, cılız, zəif, cansız

**fleshly** [ˈfleʃlɪ] *adj* **1.** bədən; **~ strength** fiziki qüvvə; **2.** cismani, şəhvani, ehtiraslı; **3.** kök, yoğun, şişman

**flesh-meat** [ˈfleʃmi:t] *n* ət, ət yeməyi

**flesh-pot** [ˈfleʃpɔt] *n* ət bişirmək üçün qazan

**fleshy** [ˈfleʃɪ] *adj* **1.** ətli, canlı, kök; lətli; **~ peach** ətli şaftalı; **~ nose** ətli burun; **2.** yoğun, kök, şişman

**flexibility** [ˌfleksəˈbɪlɪtɪ] *n* **1.** elastiklik, asanlıqla əyilmə qabiliyyəti; **2.** *tex.* döyülə bilmə, döyülmə qabiliyyəti *(metallarda)*; **3.** tez təsir altına düşmə, yumşaqlıq, güzəştə getmə, tez razılaşma, yolayovuqluq; **4.** çeviklik, cəldlik, manevr etmə /uyğunlaşma qabiliyyəti

**flexible** [ˈfleksəbl] *adj* **1.** elastik, iti, zirək, çevik, tezuyuşan, tez uyğunlaşan; **2.** *məc.* mahir, usta, hiyləgər; zəngin; **~ language** zəngin dil; **3.** yumşaq, elastik; **~ wire** yumşaq məftil; **~ binding** yumşaq cildləmə; **~ cable** elastik tros; **~ pipe** şlanq; **4.** *tex.* döyülə bilən, döyülməyə qabil olan *(metal)*; **5.** tez təsir altına düşən, tez razılaşan/yola gələn, üzüyola, güzəştə gedən; **~ character** yumşaq xarakter

**flick[1]** [flɪk] *n* **1.** yüngül/qırıq-qırıq zərbə *(barmaqla, çubuqla)*; çırtma; **2.** kəskin hərəkət, sıçrayış, sıçrama, təkan; **3.** *pl d.d.* kino, film; *He took his girl to the flicks O, qızını kinoya apardı*

**flick[2]** [flɪk] *v* **1.** yavaşca/yüngülcə vurmaq; çırtma vurmaq; çubuqla vurmaq, döymək, qamçılamaq; **to ~ a horse** atı qamçılamaq; **2.** çırpmaq, çırpıb təmizləmək; vurub salmaq; **to ~ ashes from a cigar** siqardan külü vurub salmaq; **to ~ away crumbs/dust** qırıntıları/tozu çırpıb təmizləmək

**flicker[1]** [ˈflɪkəʳ] *n* **1.** parıldama, titrək işıq vermə; sayrışma; **2.** titrəyən işıq; **3.** qısa işartı; **the final ~ of a dying fire** sönən ocağın/tonqalın son işartısı; **4.** *məc.* coşma, cuşa gəlmə, qızışma; **~ of enthusiasm** ruh yüksəkliyinin coşması; **5.** titrəmə, əsmə, həyəcan, titrəyiş; **~ of the eyelashes** kirpiklərin titrəyişi

**flicker[2]** [ˈflɪkəʳ] *v* **1.** səyrimək, sayrışmaq; parıldamaq, parlamaq, titrək parıltı/işıq vermək; alışmaq və sönmək; *The last hope flickered and died Son ümid işığı parladı və söndü; A smile flickered on his lips Onun dodaqlarında təbəssüm görünüb yox oldu;* **2.** titrəmək, əsmək; *Leaves flicker in the wind Yarpaqlar küləkdə titrəyir/əsir;* **3.** göz qırpmaq/vurmaq/eləmək, kirpik çalmaq, sayrışmaq; **4.** *amer.* müvəffəqiyyətsizliyə uğramaq, alt-üst olmaq, puça çıxmaq, baş tutmamaq

**flight[1]** [flaɪt] *n* I **1.** uçuş; **the ~ of bees** arıların uçuşu; **a bird of swift ~** itiqanadlı/itiuçan quş; **a manned ~ to other planets** insanın başqa planetlərə uçuşu; **2.** uçub getmə/köçmə, köçmə; **the spring and autumn ~s of birds** quşların yazda və payızda uçub getməsi; **continuous/non-stop ~** *av.* birbaşa uçuş; **3.** *av.* reys *(gəminin, təyyarənin və s. müəyyən marşrut üzrə yolu)*;
◊ **maiden ~** birinci uçuş *(təyyarə haq.)*; **maiden interplanetary ~** birinci planetlərarası uçuş

**flight** [flaɪt] *n* II qaçma, sürətlə geri çəkilmə; qaçaqaç; qaçış; **wild ~** vahimə içərisində qaçaqaç; **to be in ~ from...** ...dan qaçmaq; **to put / to turn to ~** qovmaq, qaçmağa məcbur etmək; **to take to ~** qaçmaq, fərar etmək; **to seek safety in ~** qaçmaqda nicat axtarmaq;
◊ **~ of capital** kapitalın axması *(xaricə)*

**flight[2]** [flaɪt] *adj* uçuş; **~ course** uçuş marşrutu; **~ strip** *hərb.* uçuş zolağı *(ehtiyatda olan)*; **~ personnel/crew** *hərb.* uçuş heyəti

**flight[3]** [flaɪt] *v* **1.** qovmaq, qaçmağa məcbur etmək; qorxutmaq, hədələmək; **2.** lələk vurmaq, lələklə bəzəmək *(oxu)*; **3.** hərəkət edən hədəfi vurmaq *(tüfənglə)*; **4.** uçmaq, dəstə ilə uçmaq *(quş haq.)*

**flight-arrow** [ˈflaɪtˌærou] *n* uzaq məsafəyə uçmaq üçün ox

**flight-lieutenant** [ˈflaɪtlefˈtenənt] *n* aviasiya kapitanı

**flight-shooting** [ˈflaɪtˈʃu:tɪŋ] *n* **1.** uzaq məsafəyə atma *(yaydan)*; **2.** uça-uça atış/ atma

**flighty** [ˈflaɪtɪ] *adj* **1.** şıltaq; dəyişkən; **2.** *məc.* qəribə; dəlisov, dəli, azğın, havalı; tezdəyişən, hərdəmxəyal, dönük; **~ imagination** qəribə təxəyyül; yüngül, yelbeyin; **~ conduct** yüngül hərəkət; **3.** dəli, ağlı çaşmış; **4.** hürkək *(at haq.)*

**fling[1]** [flɪŋ] *n* **1.** atma, tullama; atım, atış, sıçrama, tolazlama; **2.** gözlənilməz çox tələsik hərəkət; təpik/şıllaq atma *(at haq.)*; **3.** *d.d.* təşəbbüs; **to have a ~ at** *smth.* bir şey etməyə səy etmək/göstərmək; *I am willing to take a fling at*

*any job Mən gücümü hər hansı işdə sınamaq istəyirəm;* 4. *d.d.* istehzalı məzəmmət; **to have a ~ at** ***smb.*** bir kəsə sataşmaq, bir kəsi pərt etmək, bir kəsin qanını qaraltmaq; *That's a fling at you Bu sənin/sizin bostanına/bostanınıza atılan daşdır;* 5. *d.d.* azğınlıq, qudurğanlıq; eyş-işrət, əyyaşlıq, sərxoşluq, kef; şən həyat; **to have** ***one's*** **~s** hirslənmək, özündən çıxmaq

**fling²** [flɪŋ] *v (pt, pp* **flung** [flʌŋ]) I 1. atmaq, tullamaq, tolazlamaq, fırlatmaq; **to ~ a stone at** ***smb.*** bir kəsə daş atmaq; **to ~ a spear** nizə atmaq; **to ~** ***one's*** **hat into the air** şlyapasını göyə atmaq; 2. **(into)** göndərmək, yollamaq *(bir yana, bir tərəfə/yerə);* salmaq; **to ~ three divisions into a battle** döyüşə üç diviziya göndərmək/yollamaq; **to ~** ***smb.*** **into prison** bir kəsi həbsxanaya salmaq/ yollamaq; **to ~** ***one's*** **arms round** ***smb.'s*** **neck** bir kəsi qucaqlamaq; qollarını bir kəsin boynuna salmaq; 3. atılmaq, cummaq, hücum etmək, şığımaq; **to ~ out of a room** otaqdan bayıra atılmaq; **to ~ off without saying good-bye** xudahafizləşmədən sıçrayıb çıxmaq/qaçmaq/əkilmək; **to ~ oneself** üstünə/üzərinə atılmaq, tullanmaq; özünü atmaq; **to ~ oneself into a chair** özünü kresloya atmaq; **to ~ oneself into the saddle** yəhərə atılmaq; 4. yıxmaq, ayağını yerdən üzmək; 5. atmaq, dağıtmaq, səpələmək; havaya sovurmaq *(pulu);* 6. şıllaqlamaq, təpiklə vurmaq; 7. salmaq, örtmək *(paltarı və s.);* **to ~ a scarf over** ***one's*** **shoulders** şərfi çiyninə salmaq; **to ~** ***one's*** **clothes on** cəld geyinmək; 8. yağdırmaq *(söyüş);* **to ~ abuse at** ***smb.*** bir kəsə söyüş yağdırmaq;

◊ **to ~ up** ***one's*** **heels** dabanına tüpürmək, daban almaq, götürülmək, qaçmaq; **to ~ in** ***smb.'s*** **teeth** bir kəsi danlamaq/ təqsirləndirmək/suçlamaq; **to ~ oneself upon** ***smb.'s*** **mercy** bir kəsə qeydsiz-şərtsiz təslim olmaq

**flint¹** [flɪnt] *n* 1. çaxmaqdaşı, xırda çay daşı, xırda dənəli qumdaşı; **~ stone** çaxmaqdaşı; 2. *məc.* daş; *The ground was frozen to flint Torpaq donub daşa dönmüşdü;* 3. ibtidai insanın çaxmaqdaşından düzəltdiyi alət;

◊ **a heart of ~** daş ürək; *Her heart became flint Onun ürəyi daşlaşdı / daşa döndü*

**flint²** [flɪnt] *v* çaxmaq daşı ilə təmin etmək

**flint-gun** [ˈflɪntgʌn] *n* çaxmaqdaşlı tüfəng

**flint-head** [ˈflɪnthed] *n* çaxmaqdaşlı ox ucluğu

**flint-hearted** [ˈflɪntˈhɑ:tɪd] *adj* bərkürəkli, daşürəkli, rəhmsiz, zalım

**flint-paper** [ˈflɪnt.peɪpəʳ] *n* sumbata kağızı

**flint-skinning** [ˈflɪnt.skɪnɪŋ] *n* xəsislik, simiclik, zıqqılıq

**flint-ware** [ˈflɪntweəʳ] *n amer.* fayans, saxsı; saxsı qablar

**flint-wheat** [ˈflɪntwi:t] *n bot.* bərk buğda

**flinty** [ˈflɪntɪ] *adj* 1. daşlı, daş-kəsəkli; çaxmaqdaşından qayrılmış, çaxmaqdaşlı; 2. bərk, sərt, cod

**flinty-hearted** [ˈflɪntɪˈhɑ:tɪd] *adj* bərk, mətin, möhkəm, sarsılmaz, yenilməz; bərkürəkli, daşürəkli, rəhmsiz, zalım, qəddar

**flip¹** [flɪp] *n* 1. yüngül zərbə, çırtma; 2. *amer. d.d.* mayallaq vurma, mayallaq *(suya tullanma və s. zamanı);* 3. *av.* qanad üzərindən dönüş; 4. *d.d.* təyyarə ilə qısamüddətli səyahət

**flip²** [flɪp] *v* 1. yavaşca vurmaq, çırtma vurmaq, şıqqıldatmaq; **to ~ at the horse with the whip** atı qamçı ilə yavaşca vurmaq; 2. atmaq, çırpmaq, çırpıb təmizləmək; **to ~ the ash off** ***one's*** **cigarette** siqaretin külünü çırpmaq; 3. *d.d.* hərəkət edən zaman minmək *(tramvaya və s.);* 4. *id.* vurmaq; **to ~** ***one's*** **opponent over for a fall** rəqibin kürəyini yerə vurmaq *(güləşdə)*

**flirt¹** [flə:t] *n* 1. nazlı, qəmzəli *(geyimi və ya adaları ilə kişilərin xoşuna gəlməyə çalışan qadın ya qız);* 2. flirtlə məşğul olma, eşqbazlıq etmə; 3. gözlənilməz təkan *(itələmə, zərbə)*

**flirt²** [flə:t] *v* 1. flirtlə məşğul olmaq, eşqbazlıq etmək, mazaqlaşmaq; naz etmək, əzilib-büzülmək, özünü bəyəndirməyə çalışmaq; 2. *məc.* oynaqlaşmaq; zarafatlaşmaq, dilxoşluq etmək; 3. azacıq itələmək *(daldan, altdan);* dümsükləmək; 4. *məc.* hərəkətə gətirmək, təkan vermək; 5. *arx.* ələ salmaq, masqara / istehza / rişxənd etmək, lağa qoymaq

**flirtation** [flə:ˈteɪʃn] *n* eşqbazlıq, mazaqlaşma; işvə, naz; *d.d.* arvadlara pərəstişkarlıq etmə; **to carry on a little ~ with** ***smb.*** bir kəsə pərəstişkarlıq etmək, bir kəslə azacıq eşqbazlıq etmək

**flirtatious** [flə:ˈteɪʃəs] *adj* nazlı, işvəli, qəmzəli, şux, eşqbazlıq etməyi sevən/ istəyən

**flirty** [ˈflə:tɪ] *adj* eşqbazlıq etməyi sevən / istəyən; nazlı, işvəli, qəmzəli, şux

**float¹** [flout] *n* 1. üzən kütlə *(buz və s.);* 2. probka; mantar, qarovul *(balıq tilovunda);* 3. üzücü nişan *(dənizdə);* 4. siqnal üzgəci *(dənizdə/göldə lövbər salınan yeri və ya təhlükəli yerləri göstərən üzən nişan);* 5. sal; körpücük *(sahildə),* bərə; 6. üzmə kəməri; üzməyi öyrənənlər üçün hava ilə doldurulan balınc və s.

**float²** [flout] *v* 1. üzmək; durmaq/dayanmaq *(suyun yaxud başqa mayenin üzündə); Wood floats on water Ağac suda üzür; The boat floated down the river Qayıq çayla üzüaşağı üzdü; The clouds float slowly Buludlar yavaş-yavaş üzür;* 2. basmaq, daşıb basmaq, batırmaq, doldurmaq; **to ~ oil over a swamp** bataqlığı neftlə doldurmaq; 3. buraxmaq *(istiqraz, səhm);* 4. işə salmaq, işlətmək *(müəssisəni);* 5. müdafiəsini təmin etmək *(pulla);* 6. yaymaq, buraxmaq *(şayiə);* 7. *tex.* boş-boşuna işləmək

**floatability** [.floutəˈbɪlɪtɪ] *n* üzmə qabiliyyəti

**floatable** [ˈfloutəbl] *adj* üzücü, üzən, üzə bilən

**float-boat** [ˈfloutbout] *n* sal, bərə

**floater** [ˈfloutəʳ] *n* 1. sal sürən, bərəçi; 2. *d.d.* sərsəri, səfil, avara; 3. *amer.* müvəqqəti yaxud mövsümi fəhlə



**floating¹** [floutɪŋ] *n* 1. üzmə, üzgüçülük; gəmi səfəri; 2. *tik.* malakeşlə / mala ilə hamarlama

**floating²** [floutɪŋ] *adj* 1. üzücü, üzən; **~ cargo** dəniz yükü; **~ island** üzən ada; 2. oynaq, hərəkətli, azad, sərbəst; **~ earth** lil *(torpağın lil halında olan alt qatı);* axar qum; 3. dəyişkən, qeyri-sabit, tez-tez dəyişən, qərarsız; cari; **~ capital** dövriyyə kapitalı; **~ debt** qısamüddətli borc; cari borc

**floating dock** [ˈfloutɪŋˈdɔk] *n* üzən dok *(gəmi təmir olunan yer)*

**floatingly** [ˈfloutɪŋlɪ] *adv* üzən vəziyyətdə, üzə-üzə

**float-wood** [ˈfloutwud] *n* çayla axıdılacaq ağac

**flock¹** [flɔk] *n* 1. sürü, naxır; dəstə, qatar *(quşlar haq.);* qoyun sürüsü; **a ~ of wild ducks** çölördəyi dəstəsi; **~s and herds** qoyun və qaramal; 2. bir yığın/dəstə adam; **a ~ of visitors** bir dəstə qonaq; **to come in ~s** dəstə ilə axıb gəlmək; 3. uşaqlar *(ailədə);* **the flower of the ~** ailənin yaraşığı;

◊ **to stray from the ~** doğru yoldan çıxmaq, yolu azmaq; *It's a small flock that has not a black sheep at. söz. Sürü axsaqsız olmaz*

**flock²** [flɔk] *v* dəstə ilə toplaşmaq/yığışmaq /axıb gəlmək/bir yerə yığışmaq; **to ~ about** ***smb.*** bir kəsin ətrafına yığışmaq / toplaşmaq; **to ~ after** ***smb.*** dəstə ilə bir kəsin dalınca getmək; **to ~ in** dəstə ilə daxil olmaq; **to ~ out** dəstə ilə çıxmaq; **to ~ up** dəstə ilə yığışmaq / toplaşmaq

**floe** [flou] *n* 1. üzən buz parçası; 2. buzla örtülmüş sahə

**floeberg** [ˈfloubə:g] *n* aysberqin/buzdağının parçası

**flood¹** [flʌd] *n* 1. daşqın, su / sel basma; çay sularının gur vaxtı *(buzlar əriyəndə);* daşma; **in ~** sahilləri su basmış *(çayın və s.-in daşması nəticəsində);* 2. sel, axın; **~ of rain** yağış axını; **~ of light** işıq axını/seli; **~ of words** söz axını; **golden ~** günəş şüalarının topası; 3. qabarma; **ebb and ~** qabarma və çəkilmə; **~ water** daşqın suyu;

◊ **at the ~** əlverişli anda; **to take at the ~** imkandan istifadə etmək, fürsəti əldən qaçırmamaq; **to row against the ~** axına qarşı getmək / üzmək

**flood²** [flʌd] *v* 1. basmaq, daşıb basmaq; *(su, sel haq.);* 2. *məc.* söndürmək *(su ilə);* **to ~ a burning house with water** yanan evi su ilə söndürmək; 3. qərq olmaq *(işığa);* **to ~ with light** işığa qərq olmaq; *The room was flooded with light Otaq işığa qərq olmuşdu;* 4. doldurmaq; **to ~ with letters** məktublarla doldurmaq; *He was flooded with enquiries Ona suallar yağdırdılar;* 5. sahildən çıxmaq *(çay və s. haq.);* qalxmaq *(suyun səviyyəsi haq.);* 6. suvarmaq; **to ~ arable land** əkin torpaqlarını suvarmaq

**flooded** [ˈflʌdɪd] *adj* su basmış, su altında qalmış

**flooding** [ˈflʌdɪŋ] *n* 1. su basma; batırma *(suya);* 2. su ilə təmin etmə, su gətirmə/ çıxartma; irriqasiya, süni suvarma *(susuz torpaqların kanallar vasitəsilə suvarılması)*

**flood-light¹** [ˈflʌdlaɪt] *n* projektor

**flood-light²** [ˈflʌdlaɪt] *v* projektor vasitəsilə işıqlandırmaq

**flood-tide** [ˈflʌdˈtaɪd] *n* qabarma

**floor¹** [flɔ:ʳ] *n* I 1. döşəmə; döşənək; taxta səki, taxta meydança; **dirt ~** torpaq döşəmə; **parqueted ~** parket döşəmə; **cement ~** sement döşəmə; **to pace the ~** otaqda var-gəl etmək; 2. dib *(okeanın, dənizin, mağaranın)*

**floor** [flɔ:ʳ] *n* II 1. mərtəbə, qat; **ground ~** birinci mərtəbə; **first ~** ikinci mərtəbə/ qat; 2. *amer.* birinci qat/mərtəbə; **to live on the same ~** eyni mərtəbədə/qatda yaşamaq; 3. yer qatı/layı, üfüq; 4. minimal səviyyə *(qiymətin, əmək haqqının və s.)*

**floor** [flɔ:ʳ] *n* III 1. iclas zalında parlament üzvlərinin yerləri; 2. **(the ~)** çıxış etmək hüququ; **to have/to take the ~** çıxış etmək, söz almaq; **to get / to give the ~** söz almaq/ vermək; *I ask for the floor amer. Söz istəyirəm; Since I have the floor... Bir halda ki, mənə söz verilib...;* **to be on the ~** müzakirə olunmaq, müzakirədə olmaq *(qanun layihəsi haq.);* 3. auditoriya, camaat, xalq, iştirakçılar, tamaşaçılar; *The chairman appealed to the floor Sədr iclasa/iştirakçılara müraciət etdi;* **questions from the ~** yerdən suallar

**floor²** [flɔ:ʳ] *v* 1. döşəmə vurmaq/salmaq; 2. döşəməyə yıxmaq; ayağını yerdən üzmək; 3. *d.d.* qalib gəlmək; öhdəsindən /üstün gəlmək; bacarmaq, bacara bilmək; **to ~ question** suala düzgün cavab verməyi bacarmaq, sualın öhdəsindən gəlmək; 4. *d.d.* pərt etmək, utandırmaq, çaşdırmaq, çıxılmaz vəziyyətə salmaq; *The argument floored him completely Bu dəlil onu tamamilə çaşdırdı*

**floor-board** [ˈflɔ:bɔ:d] *n* döşəmə taxtası

**floor-cloth** [ˈflɔ:klɔθ] *n* 1. linoleum; 2. döşəmə əskisi

**floorer** [ˈflɔ:rəʳ] *n* 1. dülgər; 2. *d.d.* sarsıdıcı/məhvedici zərbə; 3. heyranlıq doğuran xəbər; 4. *jarq.* çox çətin imtahan sualı

**flooring** [ˈflɔ:rɪŋ] *n* 1. döşəmə, döşənək; 2. döşəmə salma

**floor-lamp** [ˈflɔ:læmp] *n* torşer

**floor leader** [ˈflɔ:ˈli:dəʳ] *n amer.* konqresdə partiyanın təşkilatçısı; konqresdə partiya fraksiyasının rəhbəri; **Senate Democratic ~** demokrat senatorların rəhbəri/təşkilatçısı

**floorman** [ˈflɔ:mæn] *n (pl* **-men** [mən]) 1. qaraj dispetçeri; 2. növbətçi montyor *(qarajda, inzibati binalarda və s.)*

**floor show** [ˈflɔ:ʃou] *n amer.* camaat arasında tamaşa *(gecə klubunda, restoranda)*

**floorwalker** [ˈflɔ:.wɔ:kəʳ] *n* mağazanın növbətçi administratoru

**flop¹** [flɔp] *n d.d.* 1. şapalaq; partıltı; **to sit down with a ~** şappıltı ilə oturmaq; 2. müvəffəqiyyətsizlik, uğursuzluq, iflas; müvəffəqiyyətsiz-

liyə / iflasa uğrama; uğursuz/ işi gətirməyən adam; *He was a flop as a reporter O, muxbir / reportyor kimi uğur qazanmadı*

**flop[2]** [flɔp] *v d.d.* 1. yerə dəymək, yıxılmaq; özünü basmaq, oturmaq, şappıltı/ tappıltı /guppultu ilə düşmək/yıxılmaq; *He flopped down on his knees O, guppultu ilə dizi üstə düşdü/yıxıldı*; 2. tullamaq; **to ~ down a heavy sack** ağır kisəni guppultu ilə yerə atmaq; 3. *d.d.* müvəffəqiyyətsizliyə uğramaq

**flop[3]** [flɔp] *adv* şappıltı ilə; **to fall ~ into the water** şappıltı ilə suya yıxılmaq

**flour[1]** ['flauəʳ] *n* buğda unu; ələ un *(narın ağ buğda unu)*; **rye ~** çovdar unu; **banana ~** banan unu

**flour[2]** ['flauəʳ] *v* 1. un səpmək; unlamaq; 2. *amer.* üyütmək, əzib toz halına salmaq *(taxılı)*

**floured** ['flauəd] *adj* 1. unlanmış, un səpilmiş

**flouring-mill** ['flauərıŋmıl] *n amer.* unüyüdən dəyirman

**flourish[1]** ['flʌrıʃ] *n* 1. əl-qol atma, arabir yelləmə; **the ~ of a sword** qılınc oynatma; 2. təşəxxüslü/iddialı jest; **to take off *one's* hat with a ~** şlyapanı böyük jestlə çıxarmaq; 3. bir şeyin təsir bağışlayan tərzdə nümayiş etdirilməsi; təmtəraq, səs-küy, gurultu; *He showed us in with a flourish O bizi təntənəli surətdə içəri dəvət etdi; He introduced his guest with a flourish O, qonağını təntənəli surətdə təqdim etdi*; 4. çiçəklənmə, çiçək açma; tərəqqi / inkişaf etmə; tərəqqi, inkişaf; **in full ~** tam çiçəklənmə dövründə/vaxtında

**flourish[2]** ['flʌrıʃ] *v* 1. sürətlə böyümək; *All plants flourish on this soil Bu torpaqda bütün bitkilər sürətlə böyüyür*; 2. çiçəklənmək, tərəqqi/inkişaf etmək, müvəffəqiyyət qazanmaq; *This system has flourished for over three centuries Bu sistem üç yüz ildən artıq tərəqqi edib*; 3. tərpətmək, yelləmək, yırğalamaq; **to ~ a whip** qamçını yellətmək; **to ~ a telegram with good news** xoş xəbər gətirən teleqramı əlində yellətmək; **to ~ *one's* arms (about)** əl-qol atmaq, əlqolunu oynatmaq/ölçmək; 4. bəzəmək *(güllər- lə və s.)*; **to ~ with silver** gümüşlə bəzəmək, gümüşdən bəzək vurmaq

**flourishing** ['flʌrıʃıŋ] *adj* 1. çiçəklənən, tərəqqi/inkişaf edən, müvəffəqiyyət qazanan; **~ firm** inkişaf edən firma; 2. sağlam, gümrah; *He looked flourishing O, sağlam / gümrah görünürdü*

**flour-mill** ['flauəmıl] *n* dəyirman

**floury** ['flauərı] *adj* 1. un, undan hazırlanmış, xəmir; 2. un/toz səpilmiş; 3. unlu, nişastalı, tərkibində nişasta olan; **~ potato** ovulan / nişastalı kartof

**flow[1]** [flou] *n* 1. axma, axıntı, tökülmə; **a constant ~ of water** suyun daim axması; 2. sel, axın, cərəyan, xəfif axın; fəvvarə; **a steady ~** fasiləsiz axın; **~ of lava** lava axını; **a rapid ~ of words** sözlərin sürətli axını; 3. qabarma, yüksəlmə, artma *(dəniz suyu)*; 4. yığın, artma, bolluq, çoxluq

**flow[2]** [flou] *v* 1. axmaq; tökülmək; **to ~ into the sea** dənizə tökülmək *(çay haq.)*; *Tears flowed from her eyes Onun gözlərindən yaş axdı /töküldü*; 2. ötüb getmək/ keçmək *(vaxt haq.)*; 3. basmaq, daşıb basmaq *(su haq.)*

**flower[1]** ['flauəʳ] *n* 1. gül; çiçək; **natural / artificial ~s** təbii/süni çiçəklər; **wild/cut ~s** yabanı/çalaq güllər; **bunch of ~s** gül dəstəsi; **to deck *smb./smth.* with ~s** bir kəsi / şeyi güllə bəzəmək; 2. bir şeyin ən yaxşı və sağlam hissəsi, bir şeyin gülü /qaymağı; **the ~ of the nation's youth** ölkə gənclərinin gülü; **the ~ of the army** ordunun ən yaxşı və sağlam hissəsi; **the ~ of a family** ailənin bəzəyi/yaraşığı; 3. çiçəklənmə, çiçək/gül açma; **to be in ~/ to burst into ~** çiçəklənmək, çiçək/gül açmaq; **the ~ of life** həyatın çiçəklənməsi;

◊ **to sprinkle the ~s** *amer.* 1) rüşvət vermək; 2) *məc.* ağzını yağlamaq

**flower[2]** [flauəʳ] *v* 1. çiçəklənmək, çiçək/gül açmaq; *This plant flowers in June Bu bitki iyun ayında çiçək açır*; 2. çiçəklənmə dövründə olmaq; *The Italian genius flowered at the Renaissance İtaliya xalqının dühası ən yüksək tərəqqiyə İntibah dövründə çatdı*; 3. yetişdirmək, becərmək, çiçək açmaqla nəticələnmək; **to ~ azaleas under glass** azaliyanın *(çəhrayı, ağ və qırmızı çiçəkli qəşəng bəzək bitkisi)* çiçək açmasına şüşəbənddə nail olmaq; 4. çiçəklərlə bəzəmək

**flower-bed** ['flauəbed] *n* çiçək ləki/ kərdisi

**flower-bud** ['flauəbʌd] *n* qönçə; çiçək tumurcuğu

**flowered** ['flauəd] *adj* 1. çiçəklənən, çiçək açan, 2. çiçəklərlə örtülmüş / bəzədilmiş; **~ silk** çiçəklə bəzədilmiş ipək

**flowerer** ['flauərəʳ] *n* çiçək açan bitki; **early / late ~** tez / gec çiçəkaçan bitkilər

**flowerful** ['flauəfl] *adj* çiçəklərlə bol olan; çiçəklərlə dolu

**flower-garden** ['flauə.ga:dn] *n* çiçəklik, güllük, gülüstan, gülşən, gülzar, gül bağı

**flower-girl** ['flauəgə:l] *n* çiçəkçi/gülçü qız, çiçək/gül satan qız

**flower-pot** ['flauəpɔt] *n* 1. gül dibçəyi; 2. fişəng növü

**flower-stand** ['flauəstænd] *n* güllər üçün altlıq; jardinyer *(ev çiçəkləri üçün qutu və ya səbət)*

**flowing[1]** ['flouıŋ] *n* 1. axma, axın, axıntı, tökülmə; 2. sel, çay; dalğa, ləpə

**flowing[2]** ['flouıŋ] *adj* axan, axıcı, axar; **~ water** axar su; **~ well** 1) fontan vuran quyu *(buruq quyusu)*; 2) öz-özünə axıb gedən artezian quyuları

**flu** [flu:] *n d.d. tib.* qrip, influensa *(xəstəlik)*

**fluctuable** ['flʌktjuəbl] *adj* tərəddüd edən, mütərəddid, qərarsız, möhkəm olmayan



**fluctuant** ['flʌktjuənt] *adj* 1. yellənən, tərpənən, həyəcanlanan; dalğalar üzərində yavaşca yırğalanan/ yellənən; 2. möhkəm olmayan, dəyişkən, enib-qalxan; **a ~ foreign exchange** dəyişkən xarici valyuta

**fluctuate** ['flʌktjueıt] *v* 1. enib-qalxmaq *(qiymət haq.)*; möhkəm olmamaq, dəyişkən/qərarsız/qətiyyətsiz olmaq; *The cost of sugar fluctuates Şəkərin qiyməti enib-qalxır*; 2. yellənmək, yırğalanmaq, dalğalanmaq; həyəcana/təşvişə gəlmək; dalğalar üzərində yavaş-yavaş yırğalanmaq/ tərpənmək/yellənmək; 3. tərpətmək, titrətmək, əsdirmək, yellətmək, yırğalandırmaq, ləpələndirmək; həyəcanlandırmaq, əsəbiləşdirmək, təşvişə salmaq, narahat etmək

**fluctuating** ['flʌktjueıtıŋ] *adj* dəyişkən, tərəddüd edən, möhkəm olmayan, dəyişilmiş, əvəz edilmiş; **~ prices** dəyişkən qiymətlər

**fluctuation** ['flʌktju'eıʃn] *n* 1. tərəddüd, qərarsızlıq; dəyişmə; enib-qalxma, dəyişkənlik; **~ of prices** qiymətlərin enib-qalxması/ dəyişkənliyi; **~ of population** əhalinin qeyri-sabitliyi/ dəyişkənliyi; 2. qətiyyətsizlik, mütərəddidlik, inanmama, qərarsızlıq; **~ of opinion** fikrin qətiyyətsizliyi

**flue** [flu:] *n* I 1. baca; 2. *tex.* dəm bacası; 3. sorucu boru

**flue** [flu:] *n* II balıq torunun bir növü

**flue** [flu:] *n* III = **flu**

**flue-boiler** ['flu:.bɔıləʳ] *n tex.* borulu qazan *(içərisindən hava və ya qaz keçən boru ilə qızdırılan buxar qazanı)*

**fluency** ['flu:ənsı] *n* rəvanlıq, səlislik, itilik, cəldlik *(nitq haq.)*; *He speaks correctly but without fluency O düz danışır, lakin nitqində rəvanlıq çatmır*

**fluent** ['flu:ənt] *adj* 1. rəvan, səlis, iti, cəld, tez, sürətli; **~ speech** sürətli/rəvan nitq; **to speak ~ French** fransız dilində rəvan/ sərbəst danışmaq; 2. uzunçu, uzundanışan, danışqan, söhbətcil, çoxdanışan; **~ speaker** danışqan/çoxdanışan/uzundanışan natiq

**fluently** ['flu:əntlı] *adv* rəvan/səlis bir surətdə, iti, cəld, tez, rəvan

**fluid[1]** ['flu:ıd] *n* maye; duru maddə; mayeli /qazabənzər mühit

**fluid[2]** ['flu:ıd] *adj* 1. maye, duru, axıcı, axar; qaz halında olan, qazaoxşar; **a ~ substance** maye maddə; 2. qeyri-sabit, tez dəyişən, qərarsız, dəyişkən; *The situation is still fluid Vəziyyət hələ də qeyri-sabitdir; The opinions of the young are fluid Cavanların fikirləri dəyişkən/ qeyri-sabit olur*

**fluidify** [flu:'ıdıfaı] *v xüs.* mayeyə / qaza çevirmək

**fluidimeter** [.flu:ı'dımi:təʳ] *n* suvaşqanlığı / yapışqanlığı ölçən cihaz

**fluidity** [flu:'ıdıtı] *n* 1. maye vəziyyəti; 2. axıcılıq, axarlıq; dəyişkənlik, qeyri-sabitlik; 3. qatılıq dərəcəsi

**fluidize** ['flu:ıdaız] *v* maye/qaz halına salmaq

**flunk[1]** [flʌŋk] *n amer. d.d.* tam müvəffəqiyyətsizlik, iflas; pis qiymət alma, kəsilmə *(əsas. imtahanda)*

**flunk[2]** [flʌŋk] *v amer. d.d.* 1. pis qiymət almaq *(imtahanda)*; *He flunked history O, tarixdən pis qiymət aldı*; 2. pis qiymət almaq *(qəbul imtahanında)*; 3. boyun qaçırmaq *(çıxış etməkdən)*; 4. azad/kənar etmək, çıxarmaq/çıxarılmaq *(işdən, vəzifədən)*, yararsızlığına görə kənar / azad edilmək *(işdən, vəzifədən)*

**flush[1]** [flʌʃ] *n* 1. gözlənilmədən/qəfildən axma, yığılma, axıb gəlmə, axın *(su haq)*; 2. gözlənilməz qızartı, qan axması *(üzə)*; qırmızılıq, qızartı, allıq; **the ~ of angered shame** xəcalətdən əmələ gələn qızartı; 3. *şair.* dan yerinin qızartısı *(səmada)*; **the ~ of dawn** şəfəq, səhər şəfəqi; 4. coşma, yüksəliş *(hiss haq.)*; **a ~ of joy** sevincin ani şiddəti; **a ~ of hope** ümid işığı

**flush[2]** [flʌʃ] *adj* 1. dolu, ağzınacan dolu; *Rivers are flushing in spring-time Yazda çaylar dolu olur/daşır*; 2. dolğun həyat, fəal, şad, sağlam, gümrah; həmişə şən / şad, gülərüzlü; 3. bol olan, zəngin *(bir şeylə)*; **to be ~ of money** *d.d.* çoxlu pulu olmaq; *Money is flush d.d. Pul kifayət edir*; 4. səxavətli, əliaçıq, israfçıl, bədxərc; **to be ~ with money** pulu sağa-sola xərcləmək / sovurmaq; 5. açıq, düz, qəti; **~ statement** açıq bəyanat; **~ blow** sərrast /güclü zərbə

**flush[3]** [flʌʃ] *v* 1. qızarmaq; **to ~ with shame** xəcalətdən qızarmaq; 2. qızartmaq, qızarmağa məcbur etmək; *The exercise had flushed their cheeks Gəzintidən onların yanaqları qızarmışdı*; 3. gözlənilmədən şırıltı ilə tökülmək, sel kimi/bolluca axmaq; 4. axmaq, gəlmək, axıb gəlmək, vurmaq *(qan, qızartı haq.)*; *The blood flushed into his face Qan onun üzünə vurdu*; 5. basmaq, daşıb basmaq; ağzınacan dolmaq; **to ~ a meadow** daşıb çəmənləri basmaq

**flushy** ['flʌʃı] *adj* qırmızımtıl, qırmızıya çalan

**fluster[1]** ['flʌstəʳ] *n* həyəcan, vəlvələ, çaxnaşma, təşviş, iztirab, əndişə, narahatlıq; **all in a ~** həyəcanlı/ əsəbi halda, təşviş içində

**fluster[2]** [flʌstəʳ] *v* 1. həyəcanlandırmaq, əsəbiləşdirmək, təşvişə salmaq, narahat etmək; həyəcana gəlmək; təşvişə düşmək, narahat olmaq, vurnuxmaq, boş-boşuna əlləşmək/çalışmaq / çapalamaq; 2. içirdib keflləndirmək *(qəsdən)*; bir balaca / azca içmək, balaca / yüngülcə keflənmək

**flustered** ['flʌstəd] *adj* 1. həyəcanlı, əsəbi, əndişəli, qızışdırılmış, əsəbiləşdirilmiş, həyəcanlandırılmış, hərarətli, coşğun; 2. bir balaca içmiş

**flute[1]** [flu:t] *n* 1. fleyta *(nəfəsli musiqi aləti)*; 2. fleytaçalan; 3. uzun baton *(uzunsov ağ çörək)*; 4. *arx.* ensiz uzun qədəh

**flute[2]** [flu:t] *v* 1. fleyta çalmaq; 2. fit çalmaq, ötmək *(quşlar haq.)*

**flutist** ['flu:tıst] *n* fleytaçalan

**flutter[1]** ['flʌtəʳ] *n* 1. titrəmə, əsmə, titrəyiş; **the ~**

of wings qanadların titrəməsi/əsməsi; 2. təşviş, lərzə, həyəcan; **all in a ~** həyəcan içində; **to fall into a ~** təşvişə düşmək, həyəcanlanmaq; **to put** *smb.* **into a ~** bir kəsi həyəcana/təşvişə salmaq, bir kəsi əsəbiləşdirmək; 3. *d.d.* çaxnaşma, vəlvələ, təlaş, mərəkə, həngamə, qarışıqlıq, sensasiya *(çox böyük təsir oyadan hadisə/xəbər)*; 4. *d.d.* risk *(qumar oyununda)*

**flutter²** [ˈflʌtəʳ] *v* 1. titrəmək, əsmək; **to ~ with joy** sevincdən əsmək; 2. *məc.* səyrimək, yanıb sönmək; 3. *məc.* lərzəyə gəlmək/düşmək, zağzağ əsmək; 4. yellənmək, yırğalanmaq, dalğalanmaq; *Flags flutter in the wind Bayraqlar küləkdə dalğalanır/yellənir; Curtains flutter in a draught Pəncərə pərdələri küləkdə tərpənir/yellənir;* 5. qanadlarını vurmaq/ çırpmaq, 6. əsəbi halda vurmaq *(nəbz haq.)*; 7. həyəcanlandırmaq, əsəbiləşdirmək, təşvişə salmaq, narahat etmək, həyəcana gətirmək, əziyyət/iztirab vermək, qorxutmaq; həyəcana gəlmək, təşvişə düşmək, əsəbiləşmək; narahat olmaq, nigaran qalmaq, iztirab çəkmək, qorxmaq; 8. sürətlə / təlaşla hərəkət etmək; *She fluttered about the room O, otaqda narahat halda vurnuxurdu;*
◊ **to ~ the dove-cote** ≅ çaxnaşma salmaq *(sakit ailədə)*

**flux¹** [flʌks] *n* 1. axma, axın, axıntı; cərəyan; sel; çay; **a ~ of air** hava axını; **a ~ of words** sözlərin axını; 2. qabarma, yüksəlmə, artma *(dəniz suyu haq.)*; **~ and reflux** qabarma və çəkilmə *(dənizdə)*; 3. daim dəyişmə *(vəziyyət haq.)*; **in a state of ~** daim dəyişmə vəziyyətində; 4. *tib.* dizenteriya, qanlı ishal

**flux²** [flʌks] *v* 1. axmaq, axıb getmək/gəlmək / çıxmaq / tökülmək; 2. *tex.* əritmək *(metalı)*; 3. işlətmə dərmanı vermək; təmizləmək

**fluxibility** [ˈflʌksɪˈbɪlɪtɪ] *n* ərimə/əriyə bilmə qabiliyyəti

**fluxible** [ˈflʌksɪbl] *adj* 1. əriyən, əriyə/əridilə bilən; 2. dəyişkən, səbatsız, qərarsız

**fly¹** [flaɪ] *n* I 1. milçək; 2. həşərat, cücü; 3. tələ yemi, yem *(heyvan, balıq və s. ovlamaq üçün)*; balıq tutmaq üçün qarmağa bağlanan lövhəcik *(balıqcıq)*; **to dress a ~** balıq tutmaq üçün qarmağa bağlanan metal lövhəcik qayırmaq; istehsal etmək;
◊ *Don't let flies stick to your heels Tələs / Tələsin, vaxt itirmə / itirməyin; There are no flies on him Onu aldada bilməzsən/bilməzsiniz; O, sayıqdır*

**fly** [flaɪ] *n* II 1. *d.d.* uçuş, uçma; uçub gəlmə /getmə/keçmə *(quşlar haq.)*; **to have a ~ in an aeroplane** təyyarə ilə getmək/uçmaq; **on the ~** havada, göydə; hərəkət zamanı, gedə-gedə; *I was late and caught the train on the fly Mən gecikmişdim və qatara gedə-gedə mindim;* 2. təkatlı muzdla işləyən minik *(fayton, minik arabası və s.)*; 3. *pl teatr.* dekorasiya asılan tirlər; 4. miyança *(şalvarda)*; 5. *tex.* taraz, pərsəng

**fly²** [flaɪ] *v* *(pt* **flew** [flu:]; *pp* **flown** [floun]) I 1. uçmaq, uçuşmaq; *Birds are flying in the air Quşlar havada uçur/uçuşur; The hawk flew round the farm Qırğı fermanın üstündə uçdu;* **to ~ swiftly** sürətlə uçmaq; **to ~ across a desert** səhranın üstündən uçmaq; **to ~ over London** Londonun üstündə uçmaq; **to catch** *smth.* **flying** bir şeyi havada uçarkən tutmaq; hava nəqliyyatından istifadə etmək, uçmaq; *Did he go by train? No, he flew O, qatarla getdi? Xeyr, uçdu /təyyarə ilə getdi;* 2. sürətlə getmək, uçmaq, tələsmək; *A car flew past me Maşın yanımdan sürətlə ötüb getdi; The train was flying through the fields and forests Qatar çöllərdən və meşələrdən sürətlə keçib gedirdi;* **to ~ into a room** ildırım sürətilə otağa girmək; **to ~ out of the room** ildırım sürətilə otaqdan çıxmaq; *It is getting late, we must fly Artıq gecdir, biz qaçmalıyıq;* **to ~ to** *smb.'s* **assistance/help** bir kəsin köməyinə tələsmək; **to ~ to** *smb.'s* **arms** bir kəsin qucağına atılmaq; *How time does fly! Vaxt necə də tez keçir!; How rumours do fly! Şayiələr necə də sürətlə yayılır!;* 3. yellənmək, dalğalanmaq; *Flags flew from every mast Bütün bayraqlar dirəklərdə dalğalanırdı;* 4. *(pt, pp* **fled**) qaçmaqla canını qurtarmaq; **to ~ the country** ölkədən qaçmaq; *He was forced to fly for his life O qaçmaqla canını qurtarmağa məcbur oldu;* **to ~ from justice** məhkəmənin təqibindən canını qurtarmaq / qaçmaq / gizlənmək; 5. itmək, yox olmaq; *His inheritance flew Onun varı-dövləti itdi / yox oldu;* 6. çıxmaq, qopmaq; *Strange words flew from his lips Onun dilindən qəribə sözlər çıxdı*

**fly** [flaɪ] *v* *(pt* **flew** [flu:]; *pp* **flown** [floun]) II 1. idarə etmək, sürmək *(təyyarəni)*; *He could fly any type of plane O hər cür təyyarəni idarə edə bilirdi;* **to ~ blind** cihaz vasitəsilə idarə etmək; 2. buraxmaq, uçurmaq *(çərpələng, quş)*; 3. *av.* təyyarə ilə daşımaq *(sərnişinləri, yükləri və s.)*; **to ~ passengers** sərnişin daşımaq *(təyyarə ilə)*; *They flew me to Paris Onlar məni Parisə apardılar (təyyarə ilə);* 4.: **to ~ open** açılmaq; taybatay açılmaq *(qapı)*; *The door flew open Qapı taybatay açıldı;* **to ~ into a state** hər hansı bir vəziyyətə düşmək; **to ~ into a rage/into a temper** qəzəblənmək, hiddətlənmək; **to ~ at / upon/on** *smb.* bir kəsin üzərinə cummaq/atılmaq; *The dog flew at the boy İt oğlanın üstünə atıldı;* **to ~ at** *smb.'s* **throat** bir kəsin boğazından tutmaq/yapışmaq; **to ~ out at** *smb.* söyüşlə bir kəsin üstünə düşmək; **to ~ to** *smb.* **for** *smth.* bir şey üçün bir kəsə müraciət etmək; **to ~ to** *smb.* **for support** yardım üçün bir kəsə müraciət etmək; *Whatever happened, she would fly to her brother for help Nə baş versə, o, kömək üçün həmişə qardaşına müraciət edərdi;* **to ~ around** *d.d.* vurnuxmaq, boş-boşuna əlləşmək, tələsmək, çapalamaq, çırpınmaq; **to ~ away** uçub getmək; *The birds flew away Quşlar uçub getdi;*
◊ **to ~ high/at high pitch/at high game** şöhrətpərəst olmaq; **to ~ low** özünü göstərməməyə çalışmaq, kölgədə qalmaq, özünə diqqəti cəlb etdirməməyə çalışmaq; **to ~ in the face of / in the teeth of** meydan oxumaq; **to ~ a flag** *dən.* bayraq altında üzmək; *The ship flew the British flag Gəmi Britaniya bayrağı altında üzürdü;* **to ~ off the handle** hirslənmək, qəzəblənmək, acıqlanmaq, özündən çıxmaq; **to ~ to arms** silaha sarılmaq; **to ~ to the head** beyninə vurmaq; *The wine flew to his head Şərab onun başına vurdu;* **to make the money ~** pulu sağasola sovurmaq; **to send the enemy ~ing** düşməni qovmaq / qaçmağa məcbur etmək



**fly-agaric** [ˈflaɪ.ægərɪk] *n* zəhərli göbələk

**fly-away¹** [ˈflaɪə.weɪ] *n* 1. qaçaq, qaçqın; 2. xasiyyətcə müvazinətsiz / özünü saxlaya bilməyən adam

**fly-away²** [ˈflaɪəˈweɪ] *adj* 1. hava ilə daşınan; 2. yellənən, dalğalanan *(paltar, saç haq.)*; 3. yüngül, yelbeyin, hərdəmxəyal, yüngülxasiyyət, dəmdəməki, arsız

**fly-bird** [ˈflaɪbə:d] *n* kolibri, milçəkquşu *(isti ölkələrdə yaşayan əlvan tüklü çox balaca quş)*

**fly-boat** [ˈflaɪbout] *n* 1. yastıdibli itigedən hollandiya qayığı; 2. itigedən qayıq

**fly-borne disease** [ˈflaɪbɔ:ndɪˈzi:z] *n* milçəklər vasitəsilə yayılan xəstəlik

**fly-catcher** [ˈflaɪ.kætʃəʳ] *n* 1. milçəktutan *(quş)*; 2. hörümçək

**flyer** [ˈflaɪəʳ] *n* I 1. təyyarəçi, təyyarəsürən; **~'s clothing** *hərb.* uçuş geyimi *(rəsmi)*; 2. quş, həşərat, cücü, yarasa, gecəquşu və s.; uçucu aparat; 3. ekspress *(ən sürətli qatar / gəmi və s.)*; 4. *amer.* vərəq *(günün siyasi məsələlərinə dair çap olunmuş)*; reklam vərəqi; 5. yekə itiayaq kenquru *(Avstraliyada yaşayan kisəli heyvan)*

**flyer** [ˈflaɪəʳ] *n* II itiqaçan at

**fly-fish** [ˈflaɪfɪʃ] *v* qarmağa/tilova milçək bağlamaqla balıq tutmaq

**fly-flap¹** [ˈflaɪflæp] *n* milçəkqovan

**fly-flap²** [ˈflaɪflæp] *v* milçəkqovan ilə vurmaq / qovmaq *(milçəkləri)*

**fly-hook** [ˈflaɪhuk] *n* balıq ovu üçün qarmaqcıq

**flying¹** [ˈflaɪɪŋ] *n* 1. uçuş, uçuşlar; **high altitude ~** çox uca uçuşlar; 2. idarə etmə, sürmə *(təyyarə)*; uçuş işi

**flying²** [ˈflaɪɪŋ] *adj* 1. uçucu, uçan, uçar; **~ column** uçan dəstə; 2. *av.* uçuş; **~ field** uçuş meydanı, aerodrom *(təyyarə meydanı)*; **~ hours** uçuş saatı; **~ line** uçuş marşrutu; **~ weather** uçuş üçün əlverişli hava; **~ safety** *av.* uçuşun təhlükəsizliyi; **~ senses** təyyarəçinin uçuş keyfiyyətləri; **~ technique** *av.* idarəetmə/sürmə texnikası; **~ time** uçuş müddəti; 3. tez, iti, cəld, sürətli, çox sürətli; **~ squad** avtomobillərdə polis dəstəsi; çevik polis dəstəsi; **~ visit** tezkeçən səfər

**flying boat** [ˈflaɪɪŋˈbout] *n* uçan qayıq

**flying bomb** [ˈflaɪɪŋbɔm] *n hərb.* uçan mərmi

**flying bridge** [ˈflaɪɪŋˈbrɪdʒ] *n* aşırma körpü

**flying cadet** [ˈflaɪŋkəˈdet] *n amer. d.d.* aviasiya məktəbinin kursantı/tələbəsi

**flying fish** [ˈflaɪɪŋfɪʃ] *n* uçan balıq

**flying machine** [ˈflaɪɪŋməˈʃi:n] *n* uçan aparat; aeroplan, təyyarə

**flying-off** [ˈflaɪɪŋˈɔf] *n av.* uçuş; qalxma, yüksəliş

**flyleaf** [ˈflaɪli:f] *n (pl* **-leaves** [-li:vz]) forzas *(kitabın blokunu cildinin üstü ilə birləşdirən vərəq)*

**fly-net** [ˈflaɪˈnet] *n* milçəklərdən qoruyan tor

**fly-paper** [ˈflaɪ.peɪpəʳ] *n* milçək üçün yapışqanlı kağız

**fly-powder** [ˈflaɪ.paudəʳ] *n* milçək qırmaq üçün toz, milçək zəhəri

**fly-weight** [ˈflaɪweɪt] *n* 1. ən yüngül çəkili güləşçi / boksçu; 2. ən yüngül çəki

**fly-wheel** [ˈflaɪwi:l] *n tex.* nazim çarx *(hərəkəti nizama salan çarx)*

**foal¹** [foul] *n* dayça, daylaq; qulun; qoduq, xotuq

**foal²** [foul] *v* doğmaq *(at)*; doğmaq, qoduqlamaq *(eşşək)*

**foam¹** [foum] *n* köpük; **waves white with ~** köpüklü dalğalar

**foam²** [foum] *v* köpüklənmək; köpüklə örtülmək; **to ~ over** köpükləyib daşmaq;
◊ **to ~ at the mouth** özündən çıxmaq, hirslənmək, qəzəblənmək; ağzı köpüklənmək

**foaming** [ˈfoumɪŋ] *n* 1. köpüklənmə; köpükdüzəltmə; 2. köpüklə söndürmə *(yanğını və s.)*

**foamless** [ˈfoumlɪs] *adj* köpüksüz, köpüklənməyən

**foamy** [ˈfoumɪ] *adj* 1. köpüklənən, köpüklü; **~ structure** köpüklü struktur *(quruluş)*; 2. köpüklə örtülmüş

**fob¹** [fɔb] *n* I 1. saat üçün cib; 2. *amer.* = **fob-chain**; 3. *amer.* brelok *(saat zəncirlərindən/bilərzikdən asılan bəzək)*

**fob** [fɔb] *n* II *jarq.* yalan, hiylə, kələk, fırıldaq; aldatma

**fob²** [fɔb] *v* aldatmaq, tovlamaq, kələk/hiylə/fırıldaq gəlmək; aldatmaqla əldə etmək; **to ~** *smb.* **out of** *smth.* bir kəsdən bir şeyi aldadıb / tovlayıb almaq

**fob-chain** [ˈfɔbtʃeɪn] *n* cib saatları üçün zəncir

**focal** [ˈfoukl] *adj* fokus; **~ length** fokus məsafəsi; **~ distance** fokusu tapmaq üçün məsafə; **~ point** *xüs.* fokus, mərkəz

**focalization** [.foukəlaɪˈzeɪʃn] *n* 1. fokusa yığma; 2. lokallaşdırma; yayılmağa qoymama *(xəstəliyi)*

**focalize** [ˈfoukəlaɪz] *v* 1. fokusa yığmaq; fokusu tapmaq; 2. *tib.* lokallaşdırmaq, yayılmağa qoymamaq, məhdudlaşdırmaq

**focus¹** [ˈfoukəs] *n* 1. optik fokus; **in ~** fokusda; **out of ~** fokusdan kənar; **to check the ~** foku-

su tapmaq; *The glasses is not at the right focus for me Binokl mənim gözlərim üçün qurulmayıb;* **to bring into ~** fokusa yığmaq; aydın təsvirini vermək *(hadisənin və s.)*; xüsusi olaraq nəzərə çarpdırmaq *(bir şeyin əhəmiyyətini)*; 2. *riyaz.* fokus *(əyri xətlər üzərindəki hər hansı nöqtəyə nisbətən xüsusi xassələrə malik olan sabit nöqtə)*; 3. parlaq surətdə işıqlandırılmış nöqtə *(səhnədə)*; 4. mərkəz, əsas mərkəz; **the ~ of a disease** xəstəliyin mərkəzi; **a ~ of trouble between nations** beynəlxalq ziddiyyətlər mərkəzi; 5. *geol.* zəlzələnin mərkəzi

**focus²** ['foukəs] *v* 1. fokusa yığmaq, fokusu tapmaq; **to ~ operaglasses to suit *one's* sight** teatr binoklunu bir kəsin gözünə uyğunlaşdırmaq; 2. fokusa qoymaq; 3. bir yerə yığmaq *(fikri və s.)*; *All eyes were focused on him Bütün nəzərlər ona yönəlmişdi/zillənmişdi*

**fodder¹** ['fɔdəʳ] *n* 1. mal-qara üçün yem; 2. *arx.* qida, yem

**fodder²** ['fɔdəʳ] *adj*: ~ **chopper** *k.t.* yemyığan /yemdoğrayan maşın; ~ **grass** yem otu /bitkisi, yaşıl yem; ~ **grain** dənli yem bitkiləri

**fodder³** ['fɔdəʳ] *v* mal-qaraya yem vermək; mal-qaranı yemləmək

**fodder beet** ['fɔdə'bi:t] *n* yem çuğunduru

**foddering** ['fɔdərıŋ] *n* yem vermə; mal-qaranı yemləmə

**foe** [fou] *n şair.* 1. düşmən, yağı; **sworn ~** qəddar düşmən; **to be a ~ to *smth.*** bir şeyin düşməni olmaq; a **political ~ of long standing** çoxdankı siyasi düşmən

**fog¹** [fɔg] *n* 1. sıx duman; **famous London ~s** məşhur London dumanları; **ground** ~ sürünən duman; **wet** ~ nəm duman; 2. çən; havada olan tüstü/toz; 3. aydın olmama, anlaşılmazlıq, qeyri-müəyyən vəziyyət; qarışıqlıq, özünü itirmə, çaşıb qalma; bilməmə, xəbərsizlik; *My mind is in a fog Mənim başım dumanlıdır; I am in a fog Mən heç nə başa düşmürəm, Mən tamamilə özümü itirmişəm;* 4. vual *(fotoqrafiyada neqativin tutqun yeri)*

**fog²** [fɔg] *v* 1. çənə/dumana bürümək; çənlənmək, dumanlanmaq; 2. çaşdırmaq, karıxdırmaq, çətinliyə salmaq; 3. *fot.* vual ilə örtülmək, aydın olmamaq

**fogger** ['fɔgəʳ] *n* I 1. xırda mal alverçisi; 2. komisyoner, komisyonçu *(ticarət işlərində müəyyən faiz almaq şərtilə vasitəçilik edən şəxs)*

**fogger** ['fɔgəʳ] *n* II *d.y.* duman siqnallarını quraşdıran fəhlə

**foggily** ['fɔgılı] *adv* 1. dumanlı, çənli; tutqun; 2. qarışıq, dolaşıq, aydın olmayan

**foggy** ['fɔgı] *adj* 1. dumanlı, dumana bürünmüş, duman basmış; ~ **morning** dumanlı/dumana bürünmüş səhər; *It is turning foggy Duman gəlir;* 2. tutqun, dumanlı, qeyri-müəyyən, anlaşılmaz; dolaşıq, qatma-qarışıq; **to have not the foggiest idea** azacıq belə təsəvvürü olmamaq; 3. *fot.* aydın / aşkar olmayan, anlaşılmaz

**fogless** ['fɔglıs] *adj* 1. dumansız, çənsiz; 2. aydın, açıq, parlaq

**fog-light** ['fɔglaıt] *n* dumanlı hava üçün fənər *(avtomobildə / parovozda və s.)*

**foible** ['fɔıbl] *n* 1. zəiflik, zəif yer, nöqsan, qüsur, eyib; 2. qəribəlik, şıltaqlıq, ədabazlıq; tərslik

**foil¹** [fɔıl] *n* 1. folqa, zər, zərvərəq, staniol *(nazik qalay təbəqəsi, zər)*; 2. amalqama *(civə ilə bəzi metalların ərintisi; qatışıq, xəlitə)*

**foil²** [fɔıl] *v* 1. folqa ilə/zərlə örtmək, amalqamalamaq, metalın üzünə civə çəkmək; 2. civə vasitəsilə filizdən qızıl və gümüşü ayırmaq; 3. təzad yaratmaqla bir şeyi xüsusi olaraq nəzərə çarpdırmaq

**foiling** ['fɔılıŋ] *n* amalqamasiya, amalqamalaşdırma *(metalın üzünə civə çəkmə; civə vasitəsilə filizdən qızıl və gümüşü ayırma üsulu)*

**foil-stone** ['fɔılstoun] *n* daş-qaşa/cavahirata oxşatma; saxta daş-qaş/cavahirat düzəltmə

**foist** [fɔıst] *v* 1. **(on, upon)** qəbul etdirmək, sırımaq, ötürmək, zorla boynuna qoymaq /qəbul etdirmək, vadar etmək; **to ~ a bad coin on *smb.*** saxta sikkəni bir kəsə sırımaq; *Although he's very religious, he doesn't try to foist his beliefs on others Baxmayaraq ki, o çox dindardır, o, inamını başqalarına qəbul etdirmir;* 2. **(in, into)** keçirtmək, gətirmək, yeritmək *(gizli olaraq və düzgün olmayan yollarla)*; 3. aid etmək, ayağına yazmaq *(müəllifliyi)*

**fold¹** [fould] *n* I 1. arxac, qoyun ağılı; ağıl *(mal-qara üçün)*; 2. qoyun sürüsü; 3. bir kilsəyə mənsub olan dindarlar;
◊ **to return to the ~** 1) ata evinə qayıtmaq; 2) kilsəyə dönmək; **to bring back the stray sheep to the ~** 1) azmış qoyunu ağıla qaytarmaq; 2) düz yola çağırmaq/dəvət etmək

**fold** [fould] *n* II 1. bükük, büküş, büzmə, qırçın, qat; qırış *(dəridə və s.)*; **~s of fat** yağ qırışları *(boyunda və s.)*; **to carry *smth.* in a ~ of *one's* robe** paltarın qatlarında bir şey gizlətmək; **curtain that falls in perfect ~s** düz qatlarla sallanan pərdə; 2. əymə, qatlama, bükmə; 3. halqa *(ilanda)*; 4. fals *(tikiş yeri, bir-birinə bitişdirilmiş nazik dəmir vərəqinin bitişdiyi yer; çap vərəqinin bükümü)*; 5. tay, lay, qanad *(qapıda və s.)*

**fold²** [fould] *v* I mal-qaranı ağıla salmaq

**fold** [fould] *v* II 1. qatlamaq, bükmək; əymək; **to ~ a letter/a newspaper** məktubu /qəzeti qatlamaq; **to ~ clothes** paltarı qatlamaq; **to ~ down the corner of a page** səhifənin küncünü qatlamaq; **to ~ *one's* cloak about one** plaşa bürünmək; **to ~ *smth.* in paper** bir şeyi kağıza bükmək; 2. qucaqlamaq, sıxmaq; **to ~ *smb.* in *one's* arms** bir kəsi qolları arasına almaq; **to ~ *smb.* to *one's* breast** bir kəsi sinəsinə sıxmaq; 3. bükmək, qatlamaq *(çap olunmuş vərəqləri/qəzeti müəyyən qayda ilə qatlamaq)*; 4. *d.d.* bağlamaq, ixtisar etmək *(müəssisəni və s.)*; *After a few months he decided to fold the magazine Bir neçə aydan sonra o, jurnalı bağlamaq qərarına gəldi*



**folder** ['fouldəʳ] *n* I çoban, naxırçı

**folder** ['fouldəʳ] *n* II 1. papka, qovluq, kağıztikən papka; 2. *amer.* kitabça, prospekt *(proqram, layihə, plan: dəftər kimi bükülmüş/qatlanmış şəkildə)*; 3. bükmə aparatı /maşını, bükücü aparat/maşın; 4. *pl* qatlama binokl/pensne *(gözlük)*; 5. bükücü *(fəhlə)*

**folding¹** [fouldıŋ] *n* 1. bükmə, qatlama; 2. qucaq, qucum

**folding²** [fouldıŋ] *adj* 1. bükülən, qatlanan, qatlama; ~ **rule** bükülən metr *(uzunluq ölçüsü)*, qatlanan xətkeş; ~ **stairs** qatlanan nərdivan; ~ **top** bükülən dam *(banda)*; 2. qaldırılan, açılan; ~ **seat** qaldırılan /açılan oturacaq

**folding-bed** ['fouldıŋbed] *n* 1. qatlama/açılıb-bükülən çarpayı; 2. *hərb.* səyyar çarpayı

**folding-boat** ['fouldıŋbout] *n* bükülən/ qatlanan qayıq, şlyupka

**folding doors** ['fouldıŋ.dɔ:z] *n* siyirmə/ qatlama qapılar

**folding-machine** ['fouldıŋmə'ʃi:n] *n* bükmə maşını, bükücü maşın

**folding-screen** ['fouldıŋskrı:n] *n* şirma *(bükülən arakəsmə)*

**folding-table** ['fouldıŋ.teıbl] *n* açılıb-yığılan stol

**foldless** ['fouldlıs] *adj* hamar, düz, qırışsız, qırışıqsız, qatsız

**fold-yard** ['fould'ja:d] *n* fermanın həyəti; mal-qara saxlanılan yer, ağıl

**foliage** ['foulııdʒ] *n* 1. yarpaqlar, ağacın yarpaqları; **a tree with handsome ~** gözəl yarpaqlı ağac; 2. yarpaqlı ornament *(rəssamlıqda, nəqqaşlıqda və s. bəzək)*; naxış

**folk** [fouk] *n* 1. *top.i* əhali, insanlar, camaat, xalq; **country ~** kənd əhalisi/camaatı; **old ~** qocalar; **young ~** gənclər, cavanlar; **poor ~** kasıblar; **rich ~** varlılar; 2. *pl* adamlar; **fine ~s** *d.d.* aristokratiya, əyan, zadəgan; **just ~s** *d.d.* sadə adamlar; 3. *d.d.* qohumlar, qohum-qardaş, qohum-əqrəba; **my ~s** mənim qohumlarım/yaxınlarım; **the old ~s at home** evdəki qocalar, ata-ana

**folk-belief** ['foukbı'lı:f] *n* xalq xurafatı / mövhumatı

**folk-custom** ['fouk'kʌstəm] *n* xalq adəti

**folk-dance** ['foukda:ns] *n* xalq rəqsi

**folk-etymology** ['fouk.etı'mɔlədʒı] *n dilç.* xalq etimologiyası *(başqa dildən keçmə sözün ana dilinin fonetik qanunlarına uyğunlaşdırılıb işlənməsi)*

**folk-lore** ['fouklɔ:ʳ] *n* folklor *(şifahi xalq yaradıcılığı; nağıllar, tapmacalar, dastanlar və s.)*

**folk-medicine** ['fouk:medsən] *n* xalq təbabəti

**folk-song** ['fouksɔŋ] *n* xalq mahnısı

**folk-tale** ['foukteıl] *n* xalq nağılı

**follow¹** ['fɔlou] *n d.d.* 1. əlavə verilən porsiya *(restoranda hər adam başına buraxılan yemək)*; 2. diyirlədərək vurulan zərbə, diyirlətmə *(bilyardda)*

**follow²** ['fɔlou] *v* 1. dalınca/ardınca getmək *(bir kəsin/şeyin)*; *Follow me Dalımca gəl /gəlin;* 2. müşayiət etmək, izləmək; *This thought follows me everywhere Bu fikir məni hər yerdə izləyir;* **to ~ *smb.* in /out** bir kəsin dalınca girmək/çıxmaq; 3. ardınca/dalınca gəlmək, sonra gəlmək; *Night follows day Gündüzün dalınca gecə gəlir; Meat followed the soup Supun dalınca ət verdilər; Dinner was followed by a dance Naharın dalınca rəqs oldu;* 4. dalınca getmək *(bir kəsin)*; varisi olmaq, ...işini davam etdirmək, davamçı olmaq, əvəz etmək; *He followed his father as head of the firm O, firmanın başçısı kimi atasını əvəz etdi;* 5. təqib etmək *(bir kəsi)*; **to ~ a retreating enemy** geri çəkilən düşməni təqib etmək; 6. diqqətlə güdmək/izləmək *(bir kəsi)*; *He thinks he's being followed Ona elə gəlir ki, onu güdürlər;* 7. diqqətlə baxmaq/göz yetirmək; *They followed all his movements closely Onlar onun bütün hərəkətlərinə diqqətlə göz yetirdilər;* 8. getmək, hər hansı istiqaməti tutmaq; **to ~ the right road** düz yolla getmək; *Follow this road, then turn left Bu yolla get/gedin, sonra sola dön/ dönün;* 9. tərəfdar olmaq, əməl/riayət etmək, yerinə yetirmək, gözləmək; **to ~ a policy** bir siyasətə tərəfdar olmaq; **to ~ the custom** adəti gözləmək; **to ~ regulation** qaydaya riayət etmək; **to ~ a strict diet** ciddi pəhriz gözləmək/saxlamaq; **to ~ directions /instructions/advice** göstərişlərə/təlimatlara/məsləhətə riayət etmək; 10. başa düşmək; diqqətlə izləmək *(fikrin inkişafını, sözləri)*; qulaq asmaq; maraqlanmaq; *I don't quite follow you Mən səni/sizi tamamilə başa düşmürəm;* 11. izləmək, maraqlanmaq; *He follows French politics very carefully O, fransız siyasəti ilə çox maraqlanır;* 12. ardıcılı/tərəfdarı olmaq; nümunə götürmək; **to ~ the best authorities** ən böyük avtoritetlərin *(nüfuzu, hörməti, etibarı olan adam)* ardıcılı olmaq; **to ~ the old masters** köhnə sənətkarlardan nümunə götürmək; **to ~ the conservative party** mühafizəkarlar partiyasının üzvü olmaq; *I am unable to follow you in all your views Mən sənin/sizin bütün fikirlərinlə/ fikirlərinizlə razılaşa bilmirəm;* 13. nəticə çıxmaq, irəli gəlmək; açıq-aydın görünmək, bəlli/aşkar olmaq; *From what I have said it follows that... Mən dediyimdən bu nəticə çıxır ki,..;* 14. məşğul olmaq *(bir şeylə)*; bir şeyi öz peşəsi/sənəti seçmək; *They follow the same profession Onlar eyni işlə məşğuldurlar;* **to ~ the law** hüquqşünas olmaq; **to ~ the sea** dənizçi olmaq;
◊ **as ~s** aşağıdakı kimi; *The terms are as fol-*

*lows Şərtlər aşağıdakı kimidir; His plan was as follows Onun planı aşağıdakı kimi idi;* **to ~ *smb.* to his grave** bir kəsi son mənzilə yola salmaq/ dəfn etmək; **to ~ home** başa vurmaq / çatdırmaq

**follower** ['fɔlouə(r)] *n* ardıcıl, tərəfdar, məsləkdaş; şagird; **the ~s of this doctrine** bu nəzəriyyənin tərəfdarları; *Many ancient Greeks were followers of Socrates Qədim yunanların çoxu Sokratın şagirdləri/davamçıları idilər*

**following[1]** ['fɔlouıŋ] *n* 1. *top.i* ardıcıllar, tərəfdarlar, məsləkdaşlar; pərəstişkarlar; *That singer has a loyal following Bu müğənninin çoxlu sədaqətli pərəstişkarları var;* 2. daimi oxucular *(jurnalın və s.);* 3. svita, məiyyət *(böyük bir şəxsin müşayiətçiləri);* **numerous ~** böyük svita; 4. ardınca/dalınca getmə; 5. *məc.* əməl/riayət etmə, gözləmə; 6. həvəs, meyl, qabiliyyət, istedad, sənət, peşə

**following[2]** ['fɔlouıŋ] *adj* 1. gələn, gələcək, sonrakı, ertəsi; o biri, o birisi; **on the ~ day** ertəsi gün/günü; 2. aşağıda göstərilən/qeyd olunan, aşağıdakı; *The following persons have received honourary degrees Aşağıda göstərilən şəxslər fəxri adlar alıblar;* 3. arxadan əsən *(külək haq.)*

**following[3]** ['fɔlouıŋ] *prep.* sonra, ardınca; *Following the lecture the meeting was open to discussion Mühazirədən sonra müzakirələr başladı*

**folly** ['fɔlı] *n* sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq, düşüncəsizlik; *What you propose is sheer folly! Sənin / Sizin təklifin / təklifiniz əsil axmaqlıqdır! / düşüncəsizlikdir!* **to pay for *one's* ~** öz düşüncəsizliyinin cəzasını çəkmək

**fond** [fɔnd] *adj* 1. **(of)** sevən, istəyən; məhəbbətli; **to be ~ of *smb.* / *smth.*** bir kəsi / şeyi sevmək; **~ of music** musiqini sevən; 2. mehriban, şəfqətli, ürəyinazik, istəyən, məhəbbətlə/eşqlə dolu; **to have a ~ expression in *one's* eyes** gözlərində məhəbbət ifadəsi olmaq; **~ wife** sevən arvad; **~ kiss** məhəbbətli öpüş; **a ~ mother** şəfqətli/sevən ana; 3. həddən artıq inanan, sadəlövh; ağılsız, düşüncəsiz, boş, əbəs, mənasız, nəticəsiz; **~ hope** boş ümid

**fondly** ['fɔndlı] *adv* 1. sevgi ilə, şəfqətlə, riqqətlə, nəvazişlə, incəliklə, sevə-sevə; **to gaze ~ at *smb.*** bir kəsə mehribanlıqla/ nəvazişlə baxmaq; 2. əbəs yerə, bihudə, səmərəsiz, nahaq, həddən artıq sadəlövhcəsinə; *He fondly believed that all men were his friends O sadəlövhcəsinə inanırdı ki, bütün insanlar onun dostudur*

**fondness** ['fɔndnıs] *n* 1. zəriflik, incəlik, mehribanlıq, riqqət, şəfqət, məhəbbət; **his ~ for his children** onun uşaqlarına məhəbbəti/mehribanlığı; 2. meyl, həvəs *(bir şeyə)*

**food** [fu:d] *n* 1. yemək, yeyinti, xörək, qida, yem; **wholesome ~** doyurucu/cana faydalı yemək; **plain ~** adi yemək; **bad ~** pis yemək; **~ and clothing** yemək və paltar; **~ and drink** yemək və içki; *The food is good there Orada yaxşı yemək verirlər; He prefers French food O, fransız yeməklərini üstün tutur;* 2. *məc.* qida; **mental / spiritual ~** mənəvi qida; 3. qida maddələri, ərzaq, azuqə; **preserved ~** konservləşdirilmiş ərzaq, konserv; **processed ~** bakaleya malları *(yeyinti şeyləri)*; **tinned/ canned ~** konserv

**foodful** ['fu:dful] *adj şair.* bol, çox, münbit, məhsuldar, bərəkətli

**foodless** ['fu:dlıs] *adj* 1. yeməksiz; ac; 2. məhsul verməyən, barsız, kasıb *(ölkə və s. haq.)*

**food-stuff** ['fu:dstʌf] *n* 1. ərzaq; qida maddələri; **green ~s of the garden** dirrik göyərtisi, tərəvəz; 2. qida, yem

**foody** ['fu:dı] *adj* yeməli, yeyilə bilən, doyurucu

**fool[1]** [fu:l] *n* 1. səfeh, axmaq, gic, sarsaq, ağılsız; **arrant ~** *d.d.* tamam gic/axmaq/ kütbeyin; *What a fool I was to believe him Ona inanmaqda mən nə qədər axmaq olmuşam; He is no fool O heç də axmaq deyil; Any fool knows that Bunu hər bir axmaq bilir*; 2. *arx.* təlxək; 3. gülünc, oyuncaq, masqara, oyuncaq yerinə qoyulan adam; **a ~ of circumstances** taleyin oyuncağı, şəraitin qurbanı; 4. ağlı zəif, kəmağıl; 5. *d.d.* zarafat, tryuk, məharət;

◊ **~'s paradise** xəyali səadət; özünü aldatma, xam xəyal, xülya; **All Fool's Day** 1 aprel *(zarafatyana aldatma günü);* **a ~'s errand** mənasız iş; əbəs yerə sərf olunan əmək; **to play the ~** özünü gicliyə /gic yerinə qoymaq; **to play the ~ with** ələ salmaq, oynatmaq, araya/lağa qoymaq, aldatmaq; **to make a ~ of *smb.*** bir kəsi ələ salmaq/oynatmaq/aldatmaq/ axmaq yerinə qoymaq

**fool[2]** [fu:l] *adj amer. d.d.* sarsaq, səfeh, axmaq, ağılsız, düşüncəsiz

**fool[3]** [fu:l] *v* 1. gic-gic zarafat etmək, şitlik etmək, nadinclik/dəcəllik etmək; 2. ələ salmaq, oynatmaq, araya/lağa qoymaq, aldatmaq *(bir kəsi);* bir kəsin başını bişirmək; *You won't fool me Sən/Siz məni aldada bilməyəcəksən/bilməyəcəksiniz; I have been fooled out of money Məni aldadıb pulumu alıblar*; **to ~ about** 1) gic-gic zarafat etmək; 2) boş yerə veyl-veyl gəzmək; 3. sürünmək *(bir kəsin dalınca);* **to ~ away** 1) boş yerə itirmək/xərcləmək /sərf etmək *(sağlamlığını, pulunu, vaxtını);* 2) əldən qaçırmaq *(fürsəti)*

**fool-born** ['fu:lbɔ:n] *adj* anadangəlmə sarsaq/ səfeh/ axmaq/ gic

**foolery** ['fu:lərı] *n* 1. sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, nadinclik, şitlik, şuluqluq; 2. gic hərəkətlər/davranışlar; 3. *top i.* səfehlər, axmaqlar, giclər, sarsaqlar

**fooling** ['fu:lıŋ] *n* nadinclik, şitlik, şuluqluq; səfehlik, təlxəklik, oyunbazlıq; hoqqabazlıq, masqaraçılıq




**foolish** ['fu:lıʃ] *adj* 1. gic, sarsaq, səfeh, axmaq, ağılsız, başıboş, düşüncəsiz; *It was a foolish thing to say Bunu demək axmaqlıq idi;* 2. boş, mənasız, cəfəng, yöndəmsiz, qəribə; **to look ~** mənasız görünmək, axmaq vəziyyətə düşmək; **~ hope** boş ümid; **to feel ~** özünü axmaq vəziyyətdə hiss etmək; 3. ağlı zəif, kəmağıl

**foolishly** ['fu:lıʃlı] *adv* 1. gic-gic, mənasızcasına, axmaqcasına, ağılsızcasına, düşüncəsiz; 2. boş-boş

**foolishness** ['fu:lıʃnıs] *n* 1. sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq, düşüncəsizlik; 2. mənasızlıq, cəfənglik, cəfəngiyyat, cəfəng / mənasız / boş söz; mənasız / gic hərəkət

**foot[1]** [fut] *n (pl* **feet)** 1. ayaq, ayağın altı, pəncə; **big/small feet** böyük/balaca ayaqlar; **on ~** piyada, ayaqla; **to go on ~** piyada getmək; 2. pəncə, ayaq *(heyvanlarda);* **the fore/hind feet** qabaq/dal ayaqlar/pəncələr; 3. addım, qədəm; yeriş; **at a ~'s pace** addımla, addım-addım; **swift of ~** ayaqdan yüngül; **light/heavy feet** yüngül/ ağır addımlar; yüngül / ağır yeriş; **to miss *one's* feet** addımını çaşdırmaq, ayaq-ayağa getməmək, ayağını bir atmamaq; **at the ~ of the bed** çarpayının ayağında; **at the ~ of a page** səhifənin axırında; 4. fut *(30,479 sm-ə bərabər ingilis uzunluq ölçüsü)*;

◊ **to recover *one's* feet** ayağa durmaq / qalxmaq; **to keep *one's* feet** ayaq üstə möhkəm durmaq/dayanmaq; **not to lift/ to move/to stir a ~** yerindən tərpənməmək; **to be under/beneath *smb.'s* ~ / feet** bir kəsin tam itaətində olmaq; **to lick *smb.'s* feet** bir kəsin yanını yalamaq, bir kəsin qabağında alçalmaq/özünü alçaltmaq; **to have/to put/to set *one's* ~ on *smb.'s* neck** bir kəsi qul etmək, kölə halına salmaq; **to be/to get on *one's* feet** 1) yerindən qalxmaq; söz almaq *(iclasda);* 2) ayağa durmaq, sağalmaq *(xəstəlikdən sonra);* 3) müstəqil olmaq *(maddi cəhətdən);* **to find/to get/to have/to know / to take the length of *smb.'s* ~** bir kəsin zəif cəhətlərini öyrənməyə çalışmaq; **to get *one's* ~ on the ladder** ilk müvəffəqiyyət qazanmaq; **to get *one's* ~ in** 1) soxulmaq *(bir yerə);* 2) qılığına girmək *(bir kəsin);* **to get up with *one's* wrong ~ foremost** əhvalı təlx olmaq; **to catch *smb.* on the wrong ~** kimisə qəfildən yaxalamaq; **to get/to have cold feet** qorxmaq, çəkinmək, ürəksizlik etmək, ağciyərlik/cəsarətsizlik/qətiyyətsizlik göstərmək; **to have/to put/to stretch *one's* feet under *smb.'s* mahogany** bir kəsin qonaqpərəstliyindən istifadə etmək, bir kəsin hesabına yaşamaq; **to pull ~** var gücü ilə qaçmaq, götürülmək, əkilmək; **to put/to set *one's* ~ down** qəti mövqe tutmaq, qətiyyətlə müqavimət göstərmək, etiraz etmək; **to put *one's* ~ in/into it** səhv etmək, səhv iş görmək, pis vəziyyətə düşmək, biabır olmaq, işləri korlamaq; **to put/to set *smb.* on his feet** adam eləmək, ayağa qaldırmaq, ortaya çıxarmaq; **with one ~ in the grave** bir ayağı gorda; **to fall /to drop on *one's* feet** çətin vəziyyətdən müvəffəqiyyətlə çıxmaq; **to measure another man's ~ by *one's* own last** *at. söz.* ≅ öz arşını ilə ölçmək

**foot[2]** [fu:t] *v* 1. uzatmaq, toxuyub uzatmaq *(corabı);* 2. oynamaq, rəqs etmək; 3. yekunlaşdırmaq, yekun vurmaq; nəticə çıxartmaq; 4. *d.d.* ödəmək *(xərcləri);* **to ~ the bill** hesabı ödəmək; 5. piyada/ayaqla getmək;

◊ **to ~ the road** 1) piyada/ayaqla getmək; 2) oynamaq, rəqs etmək; **to ~ the bill** nəticəsi üçün məsuliyyət daşımaq *(vurulan ziyana görə)*

**foot-and-mouth disease** ['futənd'mauθdı 'zi:z] *n bayt.* dabaq, ağız yarası *(heyvan xəstəliyi)*

**football[1]** ['futbɔ:l] *n* 1. futbol; **to play ~** futbol oynamaq; 2. futbol topu; 3. *amer. jarq.* oyuncaq; *The issue became a football of politics Bu vəziyyət siyasi fırıldaqlar üçün bəhanə oldu*

**football[2]** ['futbɔ:l] *adj* futbol; **~ match** futbol yarışı; **~ cup** futbol kuboku; **~ cup final** futbol kuboku uğrunda son oyun; **~ ace** yüksək dərəcəli oyunçu *(futbol);* **~ bladder** futbol topunun kamerası

**footballer** ['futbɔ:lə(r)] *n* futbolçu

**foot-bath** ['futba:θ] *n* 1. ayaq vannası; 2. tas *(ayaq yumaq üçün)*

**foot-board** ['futbɔ:d] *n* 1. ayaq yeri, pillə *(faytonda, minik arabasında, avtomobildə)*; 2. karetin dalında xidmətçi yeri; 3. *tex.* pedal *(maşınlarda və musiqi alətlərində mexanizmi hərəkətə gətirmək üçün ayaq lingi)*

**footboy** ['futbɔı] *n* 1. xidmətçi/qulluqçu/ nökər oğlan, paj *(orta əsrlərdə saraylarda xidmət edən zadəgan nəslindən oğlan);* 2. xidmətçi; kuryer, ayaqçı; 3. *hərb.* kağız paylayan əsgər

**foot-brake** ['futbreık] *n* ayaq tormozu

**foot-bridge** ['futbrıdʒ] *n* piyadalar üçün körpü

**footer** ['futə(r)] *n* 1. *d.d.* piyada, piyada gedən; 2. *jarq.* veyl, avara, yaramaz, əlindən iş gəlməyən, vaxtını boş keçirən adam

**footfall** ['futfɔ:l] *n* 1. ayaq səsləri; *His footfall died away in the distance Onun ayaq səsləri uzaqda yox oldu;* 2. yeriş; **light / heavy ~** yüngül / ağır yeriş

**foot-gear** ['futgıə(r)] *n d.d.* 1. ayaqqabı; 2. corab *(uzunboğaz yaxud gödək)*

**foot-hot** ['fut'hɔt] *adv* 1. tələsik; tez, tez-tələsik, iti, cəld, sürətlə; 2.: **to follow ~** dabanbasma/dabanbasaraq izləmək

**footing** ['futıŋ] *n* 1. istinad nöqtəsi, dayaq, dirək, söykənəcək, *Mind your footing! Əl çəkmə! /çəkməyin! Geri çəkilmə!/çəkilməyin!; The icy hill provided no footing Buzla örtülmüş təpədə ayaq qoyub dayanmağa yer yox idi*; **to keep *one's* ~** 1) ayaq üstə möhkəm durmaq; 2) *məc.*

müqavimət/ mətanət göstərmək; **to lose** ***one's*** ~ sürüşüb yıxılmaq, istinad nöqtəsini itirmək; *He lost his footing and fell O, sürüşdü və yıxıldı*; 2. mövqe; **to obtain a ~ in society** cəmiyyətdə möhkəm mövqe qazanmaq; **to effect/to make / to gain a ~** cəmiyyətdə mövqe tutmaq; **to keep** ***one's*** ~ mövqeyini saxlamaq; **to lose** ***one's*** ~ mövqeyini itirmək; 3. qarşılıqlı əlaqə/münasibət; əlaqə, münasibət; **to be on a friendly ~ with** ***smb.*** bir kəslə dostluq münasibətində olmaq; **to be on one/ an equal ~** tay/bərabər olmaq; bərabər şəraitdə olmaq;

◊ **to put on a war ~** döyüş hazırlığı vəziyyətinə gətirmək; hərbi qaydaya salmaq

**footless** ['futlıs] *adj* 1. ayaqsız; 2. boş, əsası olmayan; ~ **fancies** boş arzular; 3. *amer.* faydasız, səmərəsiz, nahaq, hədər, əbəs; 4. *d.d.* mənasız, cəfəng, sarsaq, səfeh, axmaq; ~ **rule** mənasız qayda

**foot-licker** ['fut.lıkəʳ] *n d.d.* yaltaq, qab dibi yalayan

**footling** ['futlıŋ] *adj d.d.* 1. sarsaq, səfeh, axmaq, gic, ağılsız, yelbeyin, fərasətsiz; 2. əhəmiyyətsiz, boş, mənasız, cəfəng

**foot-loose** ['futlu:s] *adj* azad, sərbəst, asılı olmayan, azadlıq sevən, qeyri-məhdud, hədsiz, hüdudsuz

**footman** [futmən] *n* 1. lakey, nökər; 2. piyada, piyada gedən; 3. *arx.* piyada əsgər

**footmark** ['futma:k] *n* ləpir, iz, ayaq izi/yeri

**foot-pace** ['futpeıs] *n* addım; **at a ~** addımla, addım-addım

**foot-page** ['futpeıdʒ] *n* xidmətçi; kuryer, ayaqçı; xidmətçi oğlan

**foot-pan** ['futpæn] *n* ayaq yumaq üçün ləyən

**foot-passenger** ['fut.pæsındʒəʳ] *n* piyada, piyada gedən

**foot-path** ['futpa:θ] *n* 1. piyada cığırı, cığır; 2. səki

**foot-print** ['futprınt] *n* iz, ləpir, ayaq izi

**foot-soldier** ['fut.souldʒəʳ] *n* piyadaçı, piyada əsgər, piyada nəfəri

**footstep** ['futstep] *n* 1. addım, yeriş; 2. addım səsləri; *I hear footsteps Mən ayaq səsləri eşidirəm*; 3. iz, ayaq izi; 4. ayaq yeri, pillə;

◊ **to follow/to tread/to walk in** ***smb.'s*** **~s 1)** bir kəsin dalınca/ardınca getmək, bir kəslə dabanbasma getmək; 2) bir kəsin izilə/yolu ilə getmək, bir kəsin ardıcılı/tərəfdarı / məsləkdaşı olmaq, bir kəsi təqlid etmək

**foot-troops** ['futtru:ps] *n pl* piyada qoşun

**foot-walk** ['futwɔ:k] *n* səki, piyadalar üçün yol

**foot-warmer** ['fut.wɔ:məʳ] *n* ayaq üçün qrelka

**footway** ['futweı] *n* = **foot-path**

**fop** [fɔp] *n* 1. qəşəng geyinməyi sevən adam, modabaz, ədabaz, yüngül *(adam)*, pijon *(şıq geyinən yüngülxasiyyətli gənc)*, təşəxxüs satan /yüngül oğlan, yelbeyin; 2. *arx.* səfeh, axmaq, gic, sarsaq

**fopling** ['fɔplıŋ] *n* şıq /qəşəng geyinməyi sevən gənc, modabaz gənc, yüngül xasiyyət / təşəxxüs satan/yelbeyin gənc

**foppery** ['fɔpərı] *n* 1. ədabazlıq, özünü bəyənmə, yüngüllük, modabazlıq, moda ilə geyinmə, qəşəng geyinmə, şıq geyinməyi sevmə; 2. çox şıq *(bahalı)* paltar; 3. *arx.* sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq, mənasızlıq, cəfənglik, cəfəngiyyat

**foppish** ['fɔpıʃ] *adj* 1. çox şıq, yaraşıqlı, bahalı, modalı; ~ **moustache/whiskers** modalı bığ/bakenbard; 2. boş, şöhrətpərəst, lovğa; **a vain/ ~ young man** şöhrətpərəst gənc adam; 3. *arx.* sarsaq, səfeh, axmaq, gic, ağılsız; qanmaz, başıboş, yelbeyin

**foppishly** ['fɔpıʃlı] *adv* 1. çox şıq, yaraşıqlı, çox bəzəkli; lovğa, ədabazcasına; **to dress ~** çox şıq geyinmək; **to behave ~** özünü iddialı/təşəxxüslü/lovğa/ədabazcasına aparmaq; 2. gicgic, mənasızcasına, axmaqcasına

**foppishness** ['fɔpıʃnıs] *n* 1. ədabazlıq, özünü bəyənmə, yüngüllük; pijonluq; modabazlıq, şıq geyinməyi sevmə; 2. boşluq, boş yer, mənasızlıq; 3. *arx.* sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq

**for¹** [fɔ:ʳ] *prep* 1. *Zaman mənasında aşağıdakıları bildirir:* 1) *uzunluq, zaman, ərazi:* ərzində; ~ **the past three weeks** son üç həftə ərzində; ~ **the next three hours** sonrakı üç saat ərzində; *I have not been there for five years Beş ildir ki, mən orada olmamışam; The movie lasts for two hours Film iki saat gedir*; ~ **years/months / days** uzun illər /aylar/günlər ərzində; ~ **the present** indi, hazırda; ~ **the time being** indiki vaxtda, hal-hazırda; 2) *hərəkət üçün nəzərdə tutulan vaxt/müddət*; ~ **a year** bir ilə; *This plan is for seven years Bu plan yeddi ilə nəzərdə tutulur*; ~ **a long time** uzun müddətə; ~ **ever/and ever** həmişəlik, ömürlük; ~ **life** ömürlük, həmişəlik; 3) *nəyinsə təyin olduğu saatı/ günü; The ceremony was arranged for two o'clock Mərasim saat ikiyə təyin olunmuşdu;* **an engagement ~ this evening** bu axşama təyin olunmuş görüş; *This is your task for tomorrow Bu sənə/sizə sabaha olan tapşırıqdır;* 2. *Məkan mənasında aşağıdakıları bildirir:* 1) *mənzil başını;* **the train ~ Moscow** Moskvaya gedən qatar; **to depart / to leave ~ London** Londona getmək; **to start ~ Paris** Parisə yola düşmək; **to steer ~** istiqamət almaq *(gəmi haq.); The ship was bound for Africa Gəmi Afrikaya gedirdi;* 2) *məsafəni, yolu, ölçünü;* **to run ~ a mile** bir mil qaçmaq; *The forest stretches for a long way Meşə bir neçə mil uzanır;* 3. *Məqsəd, niyyət bildirir; What do you want this book for? Bu kitab sənin/sizin nəyinə/nəyinizə lazımdır?;* ~ **this purpose** bu məqsədlə; **to fight ~ independence/freedom** müstəqillik/azadlıq uğrunda



mübarizə aparmaq; **to send ~ a doctor** həkim dalınca göndərmək; **to go out ~ a walk** gəzməyə çıxmaq / getmək; **to prepare ~** ***smth.*** bir şeyə hazırlaşmaq; *She is saving for old age O, qoca vaxtı üçün pul yığır; For sale Satılır (elan);* 4. *Arzu, meyl, istək, ümid, qayğı, hədəf bildirir;* **to thirst /to hunger ~ knowledge** böyük həvəslə bilik almağa can atmaq; **to be anxious / eager ~ peace** sülhə can atmaq; **to hope ~ better** daha yaxşıya ümid etmək; *He longed for home O, ev üçün darıxırdı;* **to be sorry ~** ***smb.*** bir kəsə yazığı gəlmək; **to wait ~** ***smb./smth.*** bir kəsi/şeyi gözləmək; **to look ~** ***smth.*** bir şey axtarmaq; *The child looked for his dog Uşaq itini axtardı;* 5. *Sevgi/meyl/həvəs/kin bəslənən şəxsi bildirir;* **affection/love ~ children** uşaqlara məhəbbət; *He has no liking for medicine/music Onun dərmana/musiqiyə meyli yoxdur; He has no ear for music Onun musiqi qavrama qabiliyyəti yoxdur;* 6. *Əşyanın/Şəxsin təyinatını, onun yararlılığını bildirir;* **books ~ children** uşaqlar üçün kitablar; **a tool ~ drilling holes** deliklər açmaq üçün alət; *He is just the man for the position O bu işə lap yarayan adamdır; He is fit/good for nothing O heç bir şeyə yaramır; That is just the thing for you Bu elə sənə / sizə lazım olan şeydir; This meat is not fit for food Bu ət yemək üçün yaramır; Eating too much is bad for one's health Çox yemək sağlamlıq üçün zərərdir; It is good enough for me Bu mənə tamamilə əl verir;* 7. *Bir şeyə qarşı dərman bildirir;* **a cure ~ toothache** diş ağrısına qarşı dərman, diş ağrısı dərmanı; 8. *Xeyrinə və ya ziyanına görülən işə işarə olunan şəxsi, bəzən əşyanı göstərir; Can I do anything for you? Mən sənin / sizin üçün bir şey edə bilərəmmi? He bought some flowers for the girl O, qıza bir neçə gül aldı;* **to win a name ~ oneself** özünə ad qazanmaq; 9. *Himayə və yaxud müdafiə olunan şəxs və ya əşyanı bildirir: He voted for the representative of the Communist Party O, kommunist partiyasının nümayəndəsinə söz verdi; A lawyer acts for his client Vəkil öz müştərisinin/sifarişçisinin işini aparır;* 10. *Səbəb və ya bəhanə bildirir:* görə; **to condemn ~** ***smth.*** bir şeyə görə pisləmək; **to blame ~** ***smth.*** bir şeyə görə təqsirləndirmək/suçlamaq; **to thank ~** ***smth.*** bir şeyə görə təşəkkür etmək; **to reward ~ bravery** qoçaqlığa görə təltif etmək; **to punish ~** ***smth.*** bir şeyə görə cəzalandırmaq; **to cry ~ joy** sevincindən ağlamaq; *I can't see anything for the fog Mən dumana görə heç nə görmürəm;* ~ **want / lack of** ***smth.*** bir şeyin azlığına görə; ~ **many reasons** çox səbəbə görə; ~ **the reason that...** çünki; *You will be all the better for a good night's rest Sən / Siz bir gecə doyunca yatsan/yatsanız, hər şey keçib gedər; My shoes are the worse for wear Mənim*

*çəkmələrim geymək üçün köhnəlib; If it were not for him, I should not be late O olmasaydı, mən gecikməzdim;* 11. *Əvəz /İstifadə etməni bildirir; We used boxes for chairs Biz stulların əvəzinə yeşiklərdən / qutulardan istifadə etdik; The room serves for my study Bu otaq mənim üçün kabinet/iş otağı vəzifəsini görür;* 12. *Bəzən tərcümə edilmir; They chose him for their leader Onlar onu özlərinə rəhbər seçdilər; He wants the woman for his wife O, bu qadınla evlənmək istəyir;* 13. *Başqalarına oxşadılan şəxs/əşyanı bildirir; He spoke English so well that he was taken for an Englishman O, ingiliscə o qədər yaxşı danışırdı ki, onu ingilis hesab edirdilər; He took me for my brother O məni qardaşım hesab etdi, O məni qardaşımla qarışdırdı/qarışıq saldı;* 14. *Seçkili təşkilatlarda bir qrup şəxsi, nümayəndəni bildirir;* **to sit/to run/to stand ~ Glasgow** Qlazqodan nümayəndə olmaq/seçilmək; 15. *Qiymət, dəyər bildirir:* **to pay a dollar ~ a book** kitaba bir dollar vermək; **to sell/to buy for nothing / ~ a song** çox ucuz satmaq/almaq; 16. *Mübadilə predmetini bildirir:* **to exchange one thing ~ another** bir şeyi başqasına dəyişmək; *He gave his horse for a gun O, atını tüfəngə dəyişdi;* 17. *Məbləğin miqdarını bildirir:* **a bill / a check ~ 50 dollars** 50 dollarlıq hesab/çek; 18. *Mükafatı, haqqı bildirir:* **to be paid ~** ***one's*** **service** işə görə haqq almaq; **to play ~ money** pulla oynamaq; 19. *Nisbəti / Müqayisəni bildirir: For one enemy he has a hundred friends Bir düşmənə qarşı onun yüz dostu var;* 20. ...gəlincə, ...gəldikdə, qaldı ki, ...haqqında, ...barəsində: ~ **the rest** yerdə qalana gəlincə; 21. *Birləşmələrdə:* ~ **fear that** ...məmək üçün; *He walked fast for fear he should be late O gecikməmək üçün cəld getdi;* ~ **all** baxmayaraq; nə olsa, nə olarsa; *He is stupid for all his learning Savadına baxmayaraq, o, sarsaqdır; For all his faults we like him Nöqsanlarına baxmayaraq, biz onu sevirik; For all you say, I shall stick to my opinion Nə deyirsən/deyirsiniz de/deyin, mən öz fikrimdən dönməyəcəyəm;* ~ **all its complexity** bütün dolaşıqlığı/çətinliyi ilə; *For all I care Bir halda ki, bu mənə aiddir; You may do what you like for all I care Sən / Siz istədiyini / istədiyinizi edə bilərsən / bilərsiniz, onun mənə aidiyyəti yoxdur;* ~ **all that** hətta bununla belə, baxmayaraq; *It is a victory for all that Hətta bununla belə bu, qələbədir; He says he is innocent, but I am sure he is guilty, for all that O deyir ki, günahsızdır, onun sözlərinə baxmayaraq mən bilirəm ki, o, günahkardır;* ~ **the first / second / last time** birinci / ikinci / axırıncı dəfə; **once ~ all** birdəfəlik, həmişəlik; ~ **one thing** hər şeydən əvvəl, əvvələn; *For one thing, he talks too much Hər şeydən əvvəl, o olduqca çox danışır;* ~ **good**

(and all) həmişəlik, ömürlük, lap, tamam, tamamilə, büsbütün; ~ myself / ~ my part mənə gəlincə; *For myself I shall do nothing of the sort Mənə gəlincə mən belə şey etmərəm; For my part I have no objections Mənə gəlincə mənim etirazım yoxdur;* to do *smth.* ~ oneself bir şeyi özü etmək; *I must see it for myself Mən onu özüm görməliyəm;* ~ example/instance məsələn, misal üçün; word ~ word hərfiyyən, hərfbəhərf, eynən, sözbəsöz

**for²** [fɔ:ʳ] *conj* çünki, ondan ötrü ki, ona görə ki; *He felt no fear, for he was a brave man O, qorxu hissi keçirmirdi, çünki o, cəsur adam idi; The windows were open for it was hot Pəncərələr açıq idi, çünki isti idi*

**forage¹** ['fɔrɪdʒ] *n* 1. yem, cod yem; 2. yem bitkiləri; 3. *hərb.* yem tədarük etmə; on the ~ yem tədarük etmədə; ~ crop yem bitkisi; yaşıl ot; ~ fodder mal-qara üçün yem; ~ grass yem otu, yaşıl yem

**forage²** ['fɔrɪdʒ] *v* 1. yem tədarük etmək; 2. (for, about) ərzaq axtarıb tapmaq; to ~ about / for a meal yemək yeri axtarmaq; *I have managed to forage out a few cakes Mənə bir neçə piroq tapmaq müyəssər oldu;* to ~ for oneself özünə azuqə almaq; özünə yemək hazırlamaq; 3. axtarmaq, qurdalanmaq *(bir şeyin axtarışında);* to ~ about to find a book kitab tapmaq üçün qurdalanmaq; to ~ in *one's* pockets ciblərini axtarmaq/eşələmək; 4. *arx.* soymaq, qarət etmək; talamaq, çalıb-çapmaq; 5. *k.t.* cod yemlə yemləmək / bəsləmək

**forage-cap** ['fɔrɪdʒkæp] *n* 1. furajka; 2. *hərb.* pilotka *(pilot papağı)*

**forage harvester** ['fɔrɪdʒ'havɪstəʳ] *n k.t.* 1. silosyığan kombayn; 2. otçalan/xırdalayan / doğrayan maşın

**forage-kitchen** ['fɔrɪdʒ'kɪtʃɪn] *n k.t.* yem mətbəxi *(mal-qara üçün yem hazırlanan yer)*

**forager** ['fɔrɪdʒəʳ] *n* 1. furajir *(atlar üçün yem tədarük edən və yem işlərinə baxan hərbi xidmətçi);* 2. *arx.* xəbərgətirən, xəbərverən, müjdəçi; carçı; 3. furajka

**foray¹** ['fɔreɪ] *n* 1. hücum, basqın, qəfildən hücum, axın; to make/to go on ~ qəfildən hücum/basqın etmək; 2. *arx.* qarət edilmiş qənimət

**foray²** ['fɔreɪ] *v* 1. qəfildən basqın/hücum etmək; 2. viran etmək, xaraba qoymaq, dağıtmaq, məhv etmək, soymaq, qarət etmək; talamaq, çalıb-çapmaq; to ~ land / a village ölkəni/kəndi viran etmək, xaraba qoymaq/talamaq/çalıb-çapmaq

**forbade** [fɔ:'beɪd] **to forbid** *felinin pt forması*

**forbear¹** ['fɔ:beəʳ] *n pl* 1. ulu baba, cədd; əcdad, ata-baba; *Their forbears had founded the town Bu şəhərin əsasını onların ulu babaları qoyub;* 2. sələf

**forbear²** [fɔ:'beəʳ] *v (pt* **forbore** ['fɔ:bɔ:]; *pp* **forborn** ['fɔ:bɔ:n]) 1. özünü saxlamaq; dayanmaq, durmaq; çəkinmək, vaz keçmək, imtina etmək; to ~ the use of a slang word jarqon sözlər işlətməkdən çəkinmək; 2. *arx.* səbrli/dözümlü/hövsələli olmaq; səbr etmək, dözmək, qatlaşmaq, davam/tab gətirmək; 3. *arx.* qurtarmaq, xilas olmaq, canını qurtarmaq, boyun qaçırmaq; 4. aman vermək, rəhm etmək, bağışlamaq, rəhmi/yazığı gəlmək; təqsirindən keçmək

**forbearance** [fɔ:'beərəns] *n* 1. möhkəmlik, mətanət, səbr, dözüm, təmkin; ~ from *smth.* bir şeydən imtina etmə; *You will have to exercise much forbearance in this case Bu məsələdə sən/siz çox dözüm göstərməli olacaqsan/olacaqsınız;* 2. iltifat, rəhmdillik, mərhəmət; güzəştə getmə; təkəbbürlük; to treat *smb.* with ~ bir kəslə yumşaq/mərhəmətlə rəftar etmək

**forbearing** [fɔ:'beərɪŋ] *adj* 1. təmkinli, səbirli, özünü saxlaya bilən, ehtiyatlı, möhkəm, mətanətli; təvazökar, ciddi; 2. mərhəmətli, iltifatlı, dözümlü, hövsələli; ~ smile iltifatlı təbəssüm

**forbearingly** [fɔ:'beərɪŋlɪ] *adv* 1. təmkinlə, səbirlə, ehtiyatla; 2. hövsələ ilə, tələsmədən, iltifatla, mərhəmətlə, güzəştlə; təkəbbürlə, lovğalovğa

**forbid** [fə'bɪd] *v (pt* **forbade** [fə'beɪd], **forbad** [fə'bæd]; *pp* **forbidden** [fə'bɪdn]) 1. qadağan etmək; *I forbid you to go there Mən sənə/sizə ora getməyi qadağan edirəm; I am forbidden to smoke tobacco Mənə siqaret çəkməyi qadağan ediblər;* to ~ *smb.* the country bir kəsə ölkəyə daxil olmağı qadağan etmək; *It is forbidden to smoke in this room Bu otaqda papiros çəkmək qadağandır;* 2. izin/icazə/ ixtiyar / razılıq / imkan verməmək, mane olmaq, maneçilik/əngəl/çətinlik törətmək; *My health forbids my coming Mənim səhhətim gəlməyimə imkan vermir;* 3. *arx.* danmaq, inkar /rədd etmək, boyun qaçırmaq, imtina etmək;

◊ *God/Heaven forbid Allah eləməsin/ göstərməsin; I dread to think what it would be like if, God forbid, there was another war Mən fikirləşməyə belə qorxuram ki, əgər Allah eləməsin, başqa bir müharibə olsa, nə olardı*

**forbidden** [fə'bɪdn] *adj* qadağan edilmiş; ~ trick *id.* qadağan edilmiş fənd; ~ blow *id.* qadağan edilmiş zərbə; ~ weapons qadağan edilmiş silahlar;

◊ ~ city bağlı şəhər; the ~ degrees evlənmək üçün qadağan olan qohumluq dərəcəsi; ~ fruit haram; yasaq edilmiş şey

**forbidding** [fə'bɪdɪŋ] *adj* 1. iyrənc, çirkin, nifrətli, nifrətdoğuran, çiyrəndirən, mənfur, cazibəsiz, görkəmsiz, cəlb etməyən, ürəyə yatmayan, xoşa gəlməyən; ~ face / expression pis/xoşagetməz üz/üzün ifadəsi; ~ appearance/look iyrənc görkəm; ~ person nifrət oyadan adam; 2. qorxulu, təhlükəli, qorxunc, dəhşətli, acıqlı,



zəhmli, vahiməli, müdhiş; ~ thunderclouds qorxunc qara buludlar

**force¹** [fɔ:s] *n* 1. qüvvə, qüvvət, güc, qüdrət; the ~ of the blow/of the explosion zərbənin/partlayışın gücü; with all *one's* ~ var gücü/qüvvəsi ilə; to hit with ~ qüvvə ilə vurmaq; the ~ of superstition / of error xurafatın / yanlış fikrin gücü; the ~ of argument dəlilin gücü; the ~ of example/of public opinion misalın/ictimai rəyin gücü; by ~ of intellect ağlın gücü ilə; 2. nüfuz, etibar, hörmət; to be a ~ çəkisi olmaq, böyük nüfuza malik olmaq; *Today he is an international force İndi o bütün dünyada nüfuza malikdir; He is a spent force O artıq nüfuza malik deyil;* 3. təsir, təsir qüvvəsi, kəsər, aktivlik; gerçəklik, varlıq, həqiqət; the ~ of an agreement/of a document müqavilənin / sənədin gerçəkliyi; the full ~ of the treaty müqavilənin tam qüvvəsi; in ~ qüvvədə olan, qüvvəyə malik olan *(müqavilə, sənəd və s. haq.);* to put in ~ qüvvəyə mindirmək; etibarlı etmək; həyata keçirmək; to come into ~ qüvvəyə minmək; to remain in ~ qüvvədə olmaq /qalmaq; fəaliyyət göstərmək; *This law remains in force till next year Bu qanun gələn ilə qədər qüvvədədir/etibarlıdır;* to have no ~ etibarsız olmaq,qüvvəyə malik olmamaq; 4. zor, zorakılıq, zorlama, məcbur/vadar etmə, məcburiyyət; brutal ~ zorakılıq; by ~ güclə/zorla, zor gücü ilə, cəbrən; to take by ~ zorla ələ keçirmək; to achieve *smth.* by ~ bir şeyə zorla nail olmaq; to use / to resort to ~ zorakılığa əl atmaq; the policy of ~ zor siyasəti; the use of ~ zor tətbiq etmə/işlətmə; 5. silahlı dəstə; 6. (the ~) polis idarəsi; polislər, polis dəstəsi; 7. *pl* qoşunlar; silahlı qüvvələr; the allied ~s müttəfiq qoşunlar; sea/naval ~s hərbi-dəniz qüvvələri; air ~ hərbi hava qüvvələri; ground ~ quru qoşunları; armed ~s silahlı qüvvələr; conventional ~s adi silahlarla təchiz edilmiş qoşunlar; 8. inandırıcılıq, qanecedicilik, sübutluluq, əsaslılıq; məna, dəlil, əsas, məntiq; *There is force in what you say Sən/Siz deyəndə məna var;* 9. *fiz.* qüvvət, güc, qüvvə; attractive ~ cazibə qüvvəsi; the ~ of steam/of electricity buxarın/elektrikin gücü; centrifugal ~ mərkəzdənqaçan qüvvə; ~ of gravity ağırlıq qüvvəsi; yerin cazibə qüvvəsi;

◊ by ~ of … …yolu ilə, …üsulu ilə, …vasitəsilə, …köməyi ilə, …üzündən, …səbəbindən, …görə; by ~ of contrast qarşılaşdırma/tutuşdurma yolu ilə; in ~ *hərb.* bütün/var qüvvə ilə, attack in ~ bütün/var qüvvə ilə hücum; in full ~ tam heyətlə; to join ~s səyləri birləşdirmək; by ~ and arms silah və güc ilə

**force²** [fɔ:s] *v* 1. məcbur/vadar etmək; to ~ *smb.* to do *smth.* bir kəsi bir şey etməyə məcbur etmək; to ~ a secret sirri açmağa məcbur etmək; to be ~d to yield güzəştə getməyə məcbur edilmək; *If he won't act voluntarily he must be forced O bunu könüllü surətdə etməsə, onu məcbur etmək lazımdır;* 2. zor işlətmək, zor gücü ilə ələ keçirmək; to ~ an entry zorla basıb girmək *(otağa, evə);* to ~ a town/a fortress şəhəri/ qalanı zorla zəbt/ işğal etmək; to ~ a crossing *hərb.* çayı döyüşə-döyüşə keçmək; to ~ *one's* way (through a crowd) yarıb keçmək *(camaatı);* 3. qırmaq, sındırmaq *(qapağı, qapını və s.);* to ~ a lock kilidi sındırmaq; to ~ a door qapını qırmaq; 4. bir şeyi güclə / zorla etmək; to ~ a smile/a laugh süni surətdə gülümsəmək/gülmək; 5. sürətləndirmək *(addımı, hərəkəti, inkişafı);* to ~ the pace addımını yeyinlətmək; to ~ events hadisələri sürətləndirmək; 6. *tex.* artırmaq, gücləndirmək, sürətləndlirmək *(iş rejimini);* həddindən artıq yükləmək *(maşını);* to ~ *smth.* into *smth.* bir şeyi bir yerə salmaq/soxmaq; to ~ *smb.* into *smth.* bir kəsi bir yana itələyib soxmaq/ salmaq, bir kəsi içəri itələmək; to ~ a knife into *smb.'s* breast bıçağı bir kəsin sinəsinə sancmaq; to ~ *smb.* into the room bir kəsi itələyib otağa salmaq; to ~ air into the carburettor karbüratora hava vurmaq; *He forced a tip into his hand O, çaypulunu onun əlinə soxdu;* to ~ *smb.* into *smth.* bir kəsi bir şeyə çəkmək/cəlb/daxil/sövq etmək/sürükləmək; to ~ a nation into war xalqı müharibəyə cəlb etmək/sürükləmək; to ~ *smth.* out of *smth.* bir şeyi bir yerdən sıxıb çıxartmaq; to ~ juice out of an orange portağalı sıxıb suyunu çıxartmaq; to ~ *smb.* out of *smth.* bir kəsi bir yerdən sıxışdırıb çıxartmaq; to ~ *smb.* out of the room bir kəsi otaqdan itələyib çıxartmaq; to ~ *smth.* out of *smb.* bir şeyi bir kəsdən məcburən almaq; to ~ *smth.* (up) on *smb.* bir şeyi bir kəsə zorla qəbul etdirmək; to ~ a drink upon *smb.* bir kəsi içməyə məcbur etmək; to ~ back saxlamaq, gizlətmək, boğmaq; to ~ back *one's* tears 1) göz yaşlarını boğmaq/saxlamaq; 2) *hərb.* sıxışdırmaq; to ~ down 1) qüvvə ilə örtmək/ çırpmaq; to ~ down the lid of a box qutunun qapağını qüvvə ilə örtmək; 2) salmaq, endirmək, sındırmaq, aşağı salmaq; to ~ down prices qiymətləri xeyli aşağı salmaq/endirmək; 3) yerə oturmağa/enməyə məcbur etmək *(təyyarəni)*

**forced** [fɔ:st] *adj* 1. icbari, məcburi, çarəsiz, könülsüz; ~ labour icbari iş; ~ landing *av.* məcburi yerə enmə/oturma; 2. qeyri-təbii, süni; ~ smile süni təbəssüm; ~ laugh süni gülüş; 3. *hərb.* gücləndirilmiş, sürətləndirilmiş; ~ march sürətləndirilmiş marş *(yürüş, hərbi manevr);* 4. *k.t.* istixanada yetişdirilmiş; ~ grapes istixanada yetişdirilmiş üzüm

**forcedly** ['fɔ:sɪdlɪ] *adv* 1. naçar, əlacsız, çarəsiz olaraq, məcburən; zorla, güclə, zor gücü ilə; 2. qeyri-təbii olaraq, süni surətdə

**forceful** ['fɔ:sfl] *adj* 1. güclü, qüvvətli, qüdrətli, iradəli; *He is a forceful sort of person O, güclü/qüvvətli adamdır;* 2. təsirli, kəsərli, aktiv, inandırıcı, tutarlı, əsaslı; ~ **argument** əsaslı / tutarlı dəlil
**force-land** ['fɔ:slænd] *v av.* məcburi yerə enmək / oturmaq
**forceless** ['fɔ:slɪs] *adj* gücsüz, taqətsiz, zəif, qüvvətsiz; **feeble heart and ~ hand** zəif ürək və gücsüz əl
**force-meat** ['fɔ:smi:t] *n* qiymə, iç
**forceps** ['fɔ:seps] *n* 1. cərrahlıq kəlbətini; 2. pinset, maqqaş; 3. kəlbətin
**forcible** ['fɔ:səbl] *adj* 1. zorla, zor gücü ilə həyata keçirilən, məcburi, icbari; ~ **entry** zorla/qanunsuz girmə; ~ **abduction** zorla oğurlama / qaçırtma / saxlama; 2. güclü, qüvvətli, qüdrətli; ~ **army** güclü/qüdrətli ordu; 3. inandırıcı; təsirli, təsir bağışlayan; ~ **speaker** inandırıcı natiq
**forcibly** ['fɔ:səblɪ] *adv* 1. zorla, güclə, zor gücü ilə, məcburi surətdə; 2. bərk, güclü, şiddətli, zərbə ilə; 3. parlaq surətdə, inandırıcı surətdə, qənc edici / sübutlu / əsaslı tərzdə
**forcing** ['fɔ:sɪŋ] *n* 1. zor, güc, zorakılıq, zorlama, məcbur/vadar etmə, məcburiyyət; **the ~ of an answer** cavab verməyə məcbur etmə; 2. istixanada yetişdirmə *(bitkiləri)*
**forcing-bed** ['fɔ:sɪŋbed] *n* parnik *(erkən göyərti və tərəvəz yetişdirmək üçün bina)*
**forcing-house** ['fɔ:sɪŋhaus] *n* örtülü şitillik, istixana, oranjereya *(bitki yetişdirmək üçün isti yer)*
**ford**[1] [fɔ:d] *n* çay keçidi, dayaz yer *(çayda)*
**ford**[2] [fɔ:d] *v* çayı dayaz yerdən keçmək
**fore-** [fɔ:-] *pref* 1. *İsimlə işlənir və nəyinsə qarşısında yerləşdiyini və vaxt baxımından qabaqca olduğunu bildirir:* **fore**father ulu baba; **fore**runner sələf; **fore**knowledge qabaqcadan/qabağı/gələcəyi görmə; 2. *Zaman etibarilə əvvəl gələn və ya başqa bir hərəkətdən əvvəlki hərəkəti bildirən fellərdə işlədilir:* **fore**go qabaqca / qabaq olmaq, əvvəl gəlmək; **fore**see qabaqcadan/gələcəyi görmək; **fore**tell qabaqcadan/gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək
**fore-action** ['fɔ:r.ækʃn] *n* atın qabaq ayaqlarının hərəkəti
**foreappoint** [.fɔ:rə'pɔɪnt] *v arx.* irəlicədən / qabaqcadan təyin etmək
**forebode** [fɔ:'boud] *v* 1. qabaqcadan xəbər vermək, bildirmək, əlaməti/nişanəsi olmaq; *The sky forebodes storm Səma tufan olacağından xəbər verir;* 2. qabaqcadan hiss etmək, duymaq, ürəyinə dammaq; **to ~ disaster** fəlakət/bədbəxtlik olacağını qabaqcadan hiss etmək
**fore-body** ['fɔ:.bɔdɪ] *n* 1. *dən.* gəmi korpusunun/gövdəsinin qabaq hissəsi; 2. kuzovun qabaq hissəsi
**fore-cabin** ['fɔ:.kæbɪn] *n* 1. gəminin qabaq hissəsində kayut *(gəmidə ayrıca otaq);* 2. sərnişin üçün ikinci klas otaq *(ticarət gəmisində)*
**forecast**[1] ['fɔ:ka:st] *n* 1. qabaqcadan demə, gələcəyi xəbər vermə; qabaqcadan xəbər verilmiş şey; **weather ~** hava proqnozu; **a ~ of the population in 2000** 2000-ci ildə əhalinin qabaqcadan olan/ilkin hesablanması; **a ~ of next year's trade** gələn il üçün ticarət proqnozu; 2. qabağı görücülük, qabaqcadan/gələcəyi görmə
**forecast**[2] [fɔ:'ka:st] *v (pt, pp* **forecast** *və ya* **forecasted)** 1. qabaqcadan / gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək, gələcək haqqında proqnoz vermək; **to ~ weather** hava haqqında qabaqcadan proqnoz vermək; **to ~ the future** gələcəyi qabaqcadan bildirmək; **to ~ the winners of a competition** yarışın qalibi haqqında proqnoz vermək; 2. əlaməti / nişanəsi olmaq, qabaqcadan xəbər vermək, bildirmək; *These clouds forecast storm Bu buludlar tufan olacağını bildirir / tufan olacağından xəbər verir;*
**forecaster** [fɔ:'ka:stəʳ] *n* 1. qabaqcadan/gələcəkdən xəbər verən; 2. hava proqnozunun tərtibçisi
**forecasting** [fɔ:'ka:stɪŋ] *n* qabaqcadan demə, gələcəyi xəbər vermə, proqnoz
**forechosen** [fɔ:'tʃouzn] *adj arx.* qabaqcadan seçilmiş
**fore-cited** [fɔ:'saɪtɪd] *adj* yuxarıda deyilən / göstərilən
**foreclose** [fɔ:'klouz] *v* 1. çıxarmaq, kənar / xaric etmək, qovmaq; istisna etmək; 2. *hüq.* hüququndan məhrum etmək; girov qoyulmuş əmlakı girovdan çıxartmaq hüququndan məhrum etmək; 3. qabaqcadan həll etmək/qərar vermək, qabaqcadan müəyyən etmək/göstərmək *(məsələni və s.);* **to attempt to ~ discussion** müzakirənin nəticələrini qabaqcadan müəyyənləşdirməyə çalışmaq
**fore-dated** [fɔ:'deɪtɪd] *adj* əvvəlki / köhnə tarixlə göstərilmiş
**foredestine** [fɔ:'destɪn] *v* irəlicədən/qabaqcadan müəyyən etmək
**foredoom**[1] ['fɔ:du:m] *n* irəlicədən/qabaqcadan müəyyən etmə/edilmə, tale, qismət, alın yazısı
**foredoom**[2] [fɔ:'du:m] *v* 1. taleyini qabaqcadan müəyyən/həll etmək; məhkum etmək, düçar etmək; *The attempt was foredoomed to failure Cəhd əvvəlcədən müvəffəqiyyətsizliyə məhkum idi;* 2. qabaqcadan xəbər vermək *(taleyi)*
**fore-elders** ['fɔ:reldəs] *n pl* əcdad, ata-baba, ulu babalar
**forefather** ['fɔ:.fa:ðəʳ] *n pl* əcdad, ata-baba, ulu baba
**forefeel** [fɔ:'fi:l] *v* qabaqcadan hiss etmək, ürəyə dammaq, duymaq



**forefeeling** [fɔ:'fi:lɪŋ] *n* qabaqcadan hiss etmə, ürəyə damma, duyma
**forefinger** ['fɔ:.fɪŋgəʳ] *n* şəhadət barmağı
**fore-foot** ['fɔ:fut] *n* qabaq ayaq, pəncə *(heyvanlarda)*
**foregate** ['fɔ:geɪt] *n* əsas darvaza, alaqapı
**forego** [fɔ:'gou] *v (pt* **forewent** [fɔ:'went]; *pp* **foregone** [fɔ:'gɔn]) qabaqca/qabaq olmaq, əvvəl getmək
**foregoer** [fɔ:'gouəʳ] *n* 1. sələf; ulu baba, cədd; 2. irəlidə / qabaqda gedən, başçı; 3. *arx.* xəbərgətirən, xəbərverən, müjdəçi; carçı
**forehead** ['fɔrɪd] *n* 1. alın; **large/open ~** geniş/açıq alın; **narrow ~** dar alın; **the ~ of a thinker** mütəfəkkir alnı; **to rest *one's* hand on *one's* ~** əlini alnına qoymaq; **to stroke *smb.'s* ~** bir kəsin başını sığallamaq; 2. qabaq hissə *(bir şeydə);* 3. *arx.* ədəbsizlik, qabalıq, kobudluq, hörmətsizlik, həyasızlıq, sırtıqlıq, abırsızlıq, həyasız hərəkət
**foreign**[1] ['fɔrɪn] *n arx.* yadelli, əcnəbi, özgə yerli, gəlmə, yad *(adam);*
◊ **in ~** *arx.* qürbətdə, xaricdə
**foreign**[2] ['fɔrɪn] *adj* 1. xarici, yadelli, əcnəbi; ~ **policy** xarici siyasət; ~ **market** xarici bazar; ~ **trade** xarici ticarət; ~ **relations** xarici əlaqələr; ~ **language** xarici/ əcnəbi dil; **Institute of ~ Languages** Xarici Dillər İnstitutu; ~ **customs** əcnəbi adətlər; **a person of ~ birth** xarici dövlət əhli, xarici dövlətdə doğulmuş şəxs; **goods of ~ make** xaricdə istehsal edilmiş mallar; ~ **affairs** xarici işlər; ~ **news** xarici xəbərlər; ~ **periodical** xarici vaxtaşırı/ dövri mətbuat; **outgoing/incoming ~ mail** xarici ölkəyə gedən/xarici ölkədən gələn poçt; ~ **office** *(İngiltərədə),* **Ministry of ~ Affairs** Xarici İşlər Nazirliyi 2. məlum olmayan, yad, özgə, tanış olmayan, yad, yabançı; *The name was foreign to me Bu ad mənə yad idi; The question is foreign to the matter in hand Sualın müzakirə olunan məsələyə dəxli yoxdur; Deceit is foreign to his nature Yalan onun təbiətinə yaddır*
**foreigner** ['fɔrɪnəʳ] *n* 1. əcnəbi, xarici; yadelli, gəlmə; *His speech marked him for a foreigner Onun nitqi onun əcnəbi olduğunu aşkara çıxardı;* 2. yad, özgə, yabançı, gəlmə, kənar adam; *I'm a foreigner in these parts Bu yerlərdə mən gəlməyəm/ yad adamam;* 3. *d.d.* bu yerdə rast gəlinməyən heyvan / bitki
**foreign-owned** ['fɔrɪn'ound] *adj* xarici sahibkara mənsub/məxsus olan; **to nationalize ~ companies** xarici şirkətlərə xas olan kompaniyaları milliləşdirmək
**fore-judge** [fɔ:'dʒʌdʒ] *v* nəticəni qabaqcadan həll/müəyyən etmək, nəticə haqqında qabaqcadan qərar vermək
**fore-judgement** [fɔ:'dʒʌdʒmənt] *n* qabaqcadan qəbul olunmuş qərar
**foreland** ['fɔ:lænd] *n* 1. *coğ.* burun, çıxıntı, çıxıq; 2. sahilboyu/sahilboyunda olan zona; 3. *geol.* dağətəyi *(yerlər)*
**foreleg** ['fɔ:leg] *n* qabaq ayaq / pəncə
**forelook**[1] ['fɔ:luk] *n* 1. *amer.* gələcəyə baxış; 2. *arx.* qabaqcadan/gələcəyi görmə
**forelook**[2] [fɔ:'luk] *v* 1. qabaqcadan/gələcəyi görmək; 2. irəli / qabağına baxmaq
**foreman** ['fɔ:mən] *n* 1. prisyajnı iclasçılarının *(əhalinin imtiyazlı təbəqələri tərəfindən seçilmiş məhkəmə iclasçıları)* başçısı; 2. usta; briqadir, onbaşı; iş icraçısı, tikinti işlərinə bilavasitə rəhbərlik edən texnik/mühəndis
**forementioned** ['fɔ:'menʃnd] *adj* yuxarıda deyilən / göstərilən
**foremost**[1] ['fɔ:moust] *adj* 1. qabaqdakı, irəlidə/qabaqda/başda gedən, birinci; 2. əsas, başlıca, baş, vacib, ən mühüm/zəruri, ən birinci; **the ~ troops of the army** *hərb.* ordunun ən yaxşı/qabaqda gedən hissəsi; 3. görkəmli, məşhur; **the ~ statesman of his age** dövrünün görkəmli dövlət xadimi
**foremost**[2] ['fɔ:moust] *adv* 1. irəli, qabağa; **head ~** başını irəli/qabağa verərək; 2. hər şeydən əvvəl/öncə
**foremother** ['fɔ:.mʌðəʳ] *n* böyük ana, ulu nənə
**forenamed** ['fɔ:neɪmd] *adj* yuxarıda göstərilən / adı çəkilən
**forepaw** ['fɔ:pɔ:] *n* qabaq pəncə
**fore-purpose** ['fɔ:.pə:pəs] *n* qabaqcadan qoyulmuş məqsəd
**foresee** [fɔ:'si:] *v (pt* **foresaw** [fɔ:'sɔ:]; *pp* **foreseen** [fɔ:'si:n]) qabaqcadan/ gələcəyi görmək/bilmək; **to ~ trouble** pis hadisəni qabaqcadan görmək; **to ~ the result of *smth.*** bir şeyin nəticəsini qabaqcadan bilmək
**foreseeing** [fɔ:'si:ɪŋ] *adj* 1. qabaqcadan gələcəyi görən/bilən; 2. işinin dalını-qabağını düşünən; ehtiyatlı, ehtiyatkar, tədbirli
**foreseer** [fɔ:'si:əʳ] *n* işinin dalını-qabağını düşünən adam; ehtiyatlı/tədbirli/uzaqgörən / gələcəyi görən adam
**foreshore** ['fɔ:ʃɔ:ʳ] *n* qabarma zamanı su basan / su altında qalan sahil zonası
**foresight** ['fɔ:saɪt] *n* 1. qabağı/gələcəyi görmə; qabaqcadan görmə qabiliyyəti; 2. ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq, tədbirlilik; *His foresight saved him Ehtiyatlılığı onu xilas etdi*
**foresighted** ['fɔ:saɪtɪd] *adj* qabağı/gələcəyi görmə qabiliyyətinə malik olan; işinin dalını-qabağını düşünən; ehtiyatlı, ehtiyatkar, tədbirli
**forest**[1] ['fɔrɪst] *n* 1. meşə; **pine ~** şam meşəsi; **oak ~** palıd meşəsi; **tropical ~** tropik meşə; **to lose oneself in the ~** meşədə itmək/azmaq; **to plant a ~** meşə salmaq; **to thin/to destroy a ~** meşəni seyrəkləşdirmək/məhv etmək; 2. ov

qoruğu; ov üçün qoruq yeri; **deer ~** maral ovlamaq üçün qoruq

**forest²** ['fɔrıst] *adj* meşə; **~ range** meşə sahəsi/massivi; **~ regulation 1)** meşəsalma; **2)** meşə qanunları; **~ bog** meşə bataqlığı

**forest³** ['fɔrıst] *v* meşə salmaq

**forester** ['fɔrıstə^r] *n* **1.** meşə gözətçisi, meşə sənayesi fəhləsi; **2.** meşəbəyi; **3.** meşə sakini, meşədə yaşayan; **4.** meşə quşu / heyvanı

**forest-laws** ['fɔrıstlɔ:z] *n pl hüq.* kral meşələrinin qorunması haqqında qanunlar

**forest-management** ['fɔrıst'mænıdʒmənt] *n* meşə təsərrüfatı; meşəçilik

**forestry** ['fɔrıstrı] *n* **1.** meşəçilik; meşə təsərrüfatı; **2.** meşəbəyilik; **3.** meşə massivi

**forest-tree** ['fɔrısttri:] *n* meşə ağacı, meşə ağacı növü

**foretaste¹** ['fɔ:teıst] *n* qabaqcadan ləzzətini duyma / həzz alma, xəyalən ləzzət alma, intizar; **to get a ~ of** ***smth.*** bir şey haqqında təsəvvür əldə etmək; *I had a foretaste of my present sufferings some years ago İndiki iztirablarımın əziyyətini dadmaq mənə əvvəllər də qismət olmuşdu*

**foretaste²** [fɔ:'teıst] *v* qabaqcadan ləzzətini duymaq / həzz almaq, xəyalən duymaq, intizarını çəkmək; qabaqcadan təsəvvür etmək/təsəvvürə gətirmək

**foretell** [fɔ:'tel] *v (pt, pp* **foretold** [fɔ:'tould]) qabaqcadan/gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək

**foreteller** [fɔ:'telə^r] *n* qabaqcadan/gələcəkdən xəbər verən

**forethink** [fɔ:'θıŋk] *v (***forethought***)* **1.** qabaqcadan/gələcəyi görmək; **2.** qabaqcadan fikirləşmək/düşünmək, ətraflı fikirləşmək, ölçüb-biçmək, ətraflı düşünmək, götür-qoy etmək

**forethought¹** ['fɔ:θɔ:t] *n* **1.** ətraflı/yaxşı/təfərrüatına qədər düşünülmə, əsaslılıq; qəsdən/biləbilə/qərəzlə edilmə; **a crime of ~** qəsdən/qərəzlə/bilə-bilə edilən cinayət; **2.** ehtiyat, ehtiyatlılıq, ehtiyatkarlıq, tədbirlilik; *The success was due to his foresight and forethought Onun müvəffəqiyyəti fərasətinə və ehtiyatlı olmasına görə idi;* **3.** qayğı, kömək, baxım, himayə; **full of ~** qayğıçəkən, qeydəqalan, qeydkeş

**forethought²** ['fɔ:θɔ:t] *adj* nəzərdə/ fikirdə tutulmuş, planı qurulmuş / düşünülmüş, qabaqcadan ətraflı düşünülmüş; qəsdən / qərəzlə / bilə-bilə edilən

**foretime** ['fɔ:taım] *n* keçmiş zamanlar, keçmiş

**foretold** [fɔ:'tould] **to foretell** *felinin pt, pp formaları*

**fore-tooth** ['fɔ:tu:θ] *n* **1.** *pl* qabaq diş; **2.** *pl arx.* süd dişlər

**foretype** ['fɔ:taıp] *n* örnək, nümunə, timsal

**forever** [fə'revə^r] *adv* **1.** həmişəlik, ömürlük, əbədi, daimi; **2.** *amer.* aramsız, ara vermədən, durmadan

**forewarn** [fɔ:'wɔ:n] *v* əvvəlcədən xəbərdar etmək, çəkindirmək, saqındırmaq, qabağını almaq

**foreword** ['fɔ:wə:d] *n* müqəddimə, başlanğıc, giriş

**forfeit¹** ['fɔ:fıt] *n* **1.** cərimə; **to pay the ~** cəriməni ödəmək/vermək; **2.** cəza *(cinayətə/yaramaz hərəkətə görə); His life was the forfeit for his carelessness Səhlənkarlığı ucbatından o, həyatını qurban verdi;* **3.** müsadirə, cərimə qoyma; hüququndan məhrum etmə; **the ~ of civil rights** vətəndaş hüquqlarından məhrum etmə / edilmə; **4.** müsadirə edilmiş şey

**forfeit²** ['fɔ:fıt] *adj* müsadirə edilmiş; **property ~ (in) to the state** dövlət tərəfindən müsadirə edilmiş əmlak

**forfeit³** ['fɔ:fıt] *v* **1.** məhrum olmaq, əlindən çıxmaq, itirmək *(bir şeyi);* altını/cəfasını/əziyyətini/zərərini çəkmək *(yaramaz hərəkətə / cinayətə görə);* **to ~ one's property** əmlakını itirmək *(müsadirə nəticəsində);* **to ~ liberty** azadlıqdan məhrum olmaq; *He forfeited his driving licence Sürücülük vəsiqəsi onun əlindən alındı, Onu sürücülük vəsiqəsindən məhrum etdilər;* **2.** hüququndan məhrum olmaq, hüququnu itirmək *(bir şeyə);* **to ~ smb.'s confidence** bir kəsin yanında etibarını itirmək; **to ~ one's honour** adını /şərəfini ləkələmək; **to ~ a point** *id.* xal itirmək *(oyundan imtina etməyə / oyuna gəlməməyə görə)*

**forfend** [fɔ:'fend] *v* **1.** *amer.* qorumaq, mühafizə etmək, saxlamaq, qabağını/qarşısını almaq; **2.** *arx.* döndərmək, çevirmək, qaytarmaq, çəkindirmək; *God forfend! Allah eləməsin, Allah göstərməsin!*

**forge¹** [fɔ:dʒ] *n* **1.** dəmirçixana; **to work in/ at a ~** dəmirçixanada işləmək; **2.** dəmirçi kürəsi/ocağı

**forge²** [fɔ:dʒ] *v* **1.** döymək *(dəmiri);* **to ~ iron/steel** dəmiri/poladı döymək; **to ~ an anchor** lövbər qayırmaq/döymək, döyüb lövbər hazırlamaq; **2.** saxtalaşdırmaq, saxtasını düzəltmək, saxtakarlıq etmək; **to ~ smb.'s signature/cheque** bir kəsin imzasını/çekini saxtalaşdırmaq; **3.** saxtakarlıq etmək, saxta iş görmək, uydurmaq, quraşdırmaq, özündən qondarmaq; **4.** ixtira / icad etmək; **to ~ a scheme** plan düzəltmək/fikirləşib tapmaq

**forge-man** ['fɔ:dʒmən] *n (pl* **-men** [-mən]) dəmirçi

**forger** ['fɔ:dʒə^r] *n* **1.** saxtakar, saxtakarlıq edən şəxs; **2.** saxta/qəlp pul kəsən; **3.** uydurmaçı, yalançı; saxtakarlıqla məşğul olan adam; **4.** dəmirçi; **iron ~** dəmirçi; **fork ~** çəngəl qayıran usta

**forgery** ['fɔ:dʒərı] *n* **1.** saxtakarlıq, saxtalaşdırma *(sənədləri, pulları);* **2.** saxta imza/sənəd; *The*



*testimonial is a forgery Bu şəhadətnamə/vəsiqə saxtadır;* **3.** *şair.* iftira, uydurma

**forget** [fə'get] *v (pt* **forgot** [fə'gɔt]; *pp* **forgotten** [fə'gɔtn]) **1.** yaddan çıxartmaq, unutmaq; *You must not forget that... Sən /Siz unutmamalısan / unutmamalısınız ki...; You've forgotten all your French Sən/Siz fransız dilini tamamilə unutmusan/unutmusunuz;* **2.: to ~ oneself** ədəbsizlik/nəzakətsizlik etmək, həddini aşmaq, özünü apara bilməmək; **3.** unutmaq, yaddan çıxartmaq, gözdən qaçırmaq; **to ~ to do** ***smth.*** bir şeyi etməyi unutmaq/ yaddan çıxartmaq; *The following names were forgotten in drawing up the list Siyahını tərtib edərkən aşağıdakı adlar yaddan çıxarılmışdır/unudulmuşdur;* **4.** saymamaq, xor baxmaq, məhəl qoymamaq, laqeydlik göstərmək; **to ~ one's duties** öz vəzifəsinə laqeydlik göstərmək; *His services were forgotten by the authorities Hökumət orqanları onun xidmətlərinə məhəl qoymadılar;*

◊ *Forget it! Bu haqda danışmağa dəyməz, Bunu yaddan çıxart/çıxardın*

**forgetful** [fə'getfl] *adj* **1.** unutqan, yaddaşsız, hafizəsiz, huşsuz; diqqətsiz, dalğın, fikri dağınıq; *He is forgetful of things O hər şeyi unudur, O çox huşsuzdur;* **2.** etinasız, laqeyd, saymaz; qayğısız, başısoyuq; **to be ~ of one's responsibilities** öz məsuliyyətinə laqeyd münasibət göstərmək

**forgetfulness** [fə'getflnıs] *n* **1.** unutqanlıq, yaddaşsızlıq, huşsuzluq, dalğınlıq; **to suffer from ~** huşsuzluqdan əzab-əziyyət çəkmək; **2.** etinasızlıq, saymazlıq, laqeydlik göstərmə *(vəzifəyə),* yaddan çıxartma, unutma *(vəzifəni)*

**forget-me-not** [fə'getmınɔt] *n bot.* **1.** yaddaş çiçəyi; **2.** açıq-mavi rəng

**forgettable** [fə'getəbl] *adj* asanca unudulan /yaddan çıxan

**forgivable** [fə'gıvəbl] *adj* üzürlü, bağışlana bilən, bağışlanası, keçiləsi

**forgive** [fə'gıv] *v (pt* **forgave** [fə'geıv]; *pp* **forgiven** [fə'gıvn]) **1.** bağışlamaq, əfv etmək; təqsirindən keçmək; **to ~ smb.** bir kəsi bağışlamaq; **to ~ smb. smth.** bir kəsə bir şeyi bağışlamaq; **to ~ smb. for smth.** bir kəsi bir şeyə görə bağışlamaq; **to ~ an offence** təhqiri bağışlamaq; *He is not a man who easily forgives offence O, təhqiri asanlıqla bağışlayan adam deyil;* **2.** bağışlamaq, almamaq, tələb etməmək, istəməmək, imtina etmək; **to ~ a debt** borcu bağışlamaq, borcu almaqdan imtina etmək

**forgiveness** [fə'gıvnıs] *n* **1.** bağışlama, bağışlanma; günahından/təqsirindən keçmə; **to beg / to ask for ~** bağışlamağı xahiş etmək; **to grant ~** günahından keçmək, əfv etmək; **2.** yumşaqlıq, iltifat, rəhmdillik, mərhəmət; güzəştə getmə, rəhm; **in the mood of ~** mərhəmətli ovqatda; **full of ~** tam mərhəmətli

**forgiving** [fə'gıvıŋ] *adj* mərhəmətli, iltifatlı, yumşaq; rəhmdil, rəhmli, alicənab, mərd, comərd; **~ by nature** təbiətcə mərhəmətli/iltifatlı/rəhmdil/mərd/rəhmli/ alicənab/comərd

**forgotten** [fə'gɔtn] *adj* unudulmuş, yaddan çıxarılmış, atılmış, tərk edilmiş; **the ~ man** unudulmuş/yaddan çıxarılmış adam

**fork¹** [fɔ:k] *n* **1.** çəngəl; **2.** yaba, şana; **3.** haça, haça budaq; **4.** şaxə; ayrıc, yolayrıcı

**fork²** [fɔ:k] *v* **1.** yaba ilə işləmək, yaba ilə atmaq; yaba ilə qaldırmaq; **to ~ hay** otu yaba ilə yığmaq; **2.** qollara ayrılmaq, şaxələnmək; *The road forks here Yol burada şaxələnir; The river forks there Çay orada qollara ayrılır*

**forked** [fɔ:kt] *adj* haçalanmış, ikiyə bölünmüş/ayrılmış, ikilənmiş; qollara ayrılmış, şaxələnmiş; haça, çəngəlşəkilli, çəngəlvarı; **~ lightning** ziqzaqşəkilli şimşək; **~ tongue** haçalanmış/ikiyə bölünmüş /ikiyə ayrılmış dil *(ilanda);* **~ beard** haçalanmış /ikiyə ayrılmış saqqal

**forkful** ['fɔ:kful] *n* bir çəngəl, çəngəl dolusu; **a ~ of rice** bir çəngəl düyü

**forky** ['fɔ:kı] *adj* haçalanmış, ikiyə bölünmüş, çəngəlşəkilli, çəngəlvarı

**form¹** [fɔ:m] *n* **1.** forma; xarici görünüş, ümumi şəkil; **without shape or ~** formasız, şəkilsiz, biçimsiz; **in any shape or ~** hər hansı şəkildə və ya formada; **in the ~ of a cube** kub şəklində/formasında; **to take ~** lazım olan formanı almaq; **to take the ~ of** ***smth.*** bir şeyin formasını/görünüşünü almaq; *The cloud was changing its form Bulud şəklini dəyişirdi;* **2.** bədən, bədən quruluşu, qədd-qamət, boy-buxun, əndam; **well-portioned ~** proporsional/mütənasib bədən quruluşu, gözəl boy-buxun; *I saw a well-known form standing before me Qarşımda mənə yaxşı tanış olan bir adam gördüm;* **3.** sima, cild; *Proteus was able to appear in the form of any animal Protey hər hansı heyvan simasında /cildində peyda ola bilirdi;* **4.** növ, variant; tip; **~s of animal and vegetable life** heyvan və bitki həyat formaları; *It is a form of influenza Bu, xüsusi qrip növüdür;* **a ~ of activity** fəaliyyət növü; **5.** üslub, üsul, tərz, qayda; *His form in swimming is bad Onun üzmə üsulu pisdir;* **6.** vəziyyət; forma *(idman);* hazırlıq, hazır olma; **to be in good ~ 1)** yaxşı idman formasında olmaq; **2)** kefi kök olmaq; **to be in bad ~ / to be out of ~ 1)** pis idman formasında olmaq; **2)** kefi pis olmaq; **to round into ~** *id.* idman formasına düşmək; **7.** rəsmiyyət; proforma; zahiri rəsmiyyət; **as a matter of ~/for ~'s sake** proforma /zahiri rəsmiyyət xatirinə, formal olaraq, rəsmi cəhətdən; **in due ~** bütün qaydası ilə,

necə lazımsa elə; **the ~ of greeting** salam/təbrik qaydası; 8. sinif *(məktəbdə)*; **upper / lower ~s** yuxarı / aşağı siniflər; **first ~** aşağı sinif; 9. blank, forma, anket; **printed telegraph ~** çap edilmiş teleqraf blankı; **a ~ of application** ərizə forması; **to fill in/up a ~** blank /anket doldurmaq; 10. uzun skamya; 11. yuva *(dovşanın)*; 12. *tex.* tökmə üçün qəlib; 13. *tik.* taxta qəlibə vurma; **~ removal** qəlibdən çıxartma

**form**$^{2}$ [fɔ:m] *v* 1. müəyyən bir şəkil/forma /görünüş vermək; **to ~ a piece of wood into a certain shape** ağac parçasına müəyyən forma vermək; **to ~ *smth.* after / upon / from / by / in accordance with a pattern** müəyyən model üzrə nə isə etmək/yaratmaq; **state ~ed after the Roman republic** Roma respublikasının modeli üzrə yaradılmış dövlət; 2. qurmaq, təşkil etmək, yaratmaq, əmələ gətirmək; *The rain formed large pools on the lawn Yağış çəmənlikdə böyük gölməçələr əmələ gətirdi; The baby was beginning to form short words Uşaq kiçik sözlər tələffüz etməyə başlayırdı;* **to ~ the plural of a noun** ismin cəm formasını düzəltmək; **to ~ a class for beginners** yeni başlayanlar üçün qrup təşkil etmək; **to ~ an army** ordu yaratmaq; **to ~ a government** hökumət yaratmaq/təşkil etmək; **to ~ a society** cəmiyyət yaratmaq/qurmaq; 3. yaratmaq, qurmaq, hazırlamaq; **to ~ an opinion** fikir yaratmaq; **to ~ a plan** plan qurmaq / hazırlamaq; **to ~ a habit** adət yaratmaq; 4. təsəvvür etmək, təsəvvürə gəlmək, 5. öyrətmək, təlim vermək, alışdırmaq, məşq keçmək, inkişaf etdirmək; tərbiyə vermək/etmək, böyütmək; yetişdirmək; **to ~ the mind** ağlı inkişaf etdirmək/artırmaq; **to ~ the character** xarakter tərbiyə etmək; **to ~ a child by care / by attention/by severity** uşağa qayğı ilə / diqqətlə / ciddiyyətlə tərbiyə vermək

**formal** [ˈfɔ:məl] *adj* 1. rəsmi; **~ agreement /notice/protest** rəsmi saziş/xəbərdarlıq / protest; **~ dinner** rəsmi nahar/banket/ ziyafət; **~ tone** rəsmi ton/danışıq tərzi; **~ invitation** rəsmi dəvət; **~ politeness** formal nəzakət; 2. müəyyən formaya/etiketə uyğun həyata keçirilən; lazım olan qaydada hazırlanmış; **~ charge** lazımi rəsmiyyəti gözləməklə irəli sürülmüş ittiham; **~ dress** rəsmi paltar; **to go ~** *d.d.* rəsmi paltar geymək; 3. xarici, zahiri, görünən; **a ~ resemblance between two things** iki əşya arasında zahiri oxşarlıq; 4. düzgün, doğru, düz, simmetrik, simmetriyalı, mütənasib; ciddi planlaşdırılmış; **~ gardening** ağacları sıra ilə əkilmiş bağçılıq; **a beard of ~ cut** səliqə ilə qırxılmış saqqal

**formalin** [ˈfɔ:məlɪn] *n kim.* formalin *(dezinfeksiya dərmanı)*

**formalism** [ˈfɔ:məlɪzm] *n* rəsmiyyətçilik, formalizm, pedantlıq, xırdaçılıq; **~ in art** incəsənətdə formalizm; **~ of habits** adətlərdə pedantlıq / xırdaçılıq

**formalist** [ˈfɔ:məlɪst] *n* rəsmiyyətçi, formalist, formalizm tərəfdarı; pedant, xırdaçı, vasvası

**formalistic** [ˌfɔ:məˈlɪstɪk] *adj* formalizm / formalist; **~ tendencies** formalizm cərəyanları

**formality** [fɔ:ˈmælɪtɪ] *n* 1. rəsmiyyət, formal tərəf; qəbul olunmuş forma / üsul; **to comply with all formalities** bütün rəsmiyyətə riayət etmək; **formalities of law** qanunun rəsmiyyəti; *It is a pure formality Bu əsl zahiri rəsmiyyətdir;* 2. rəsmiyyətə riayət / əməl etmə; *There is too much formality at official dinner Rəsmi naharda rəsmiyyətçiliyə həddən artıq yer verilir;* 3. formal münasibət; pedantlıq, xırdaçılıq

**formalize** [ˈfɔ:məlaɪz] *v* 1. rəsmiləşdirmək, rəsmi şəklə salmaq, rəsmi status vermək; qanuniləşdirmək, qanuni şəklə salmaq; 2. rəsmi surətdə hərəkət etmək; 3. rəsmi cəhətdən/formalistcəsinə yanaşmaq

**formally** [ˈfɔ:məlɪ] *adv* 1. rəsmən, rəsmi surətdə/olaraq; **to act ~** rəsmi olaraq hərəkət etmək; 2. formal olaraq, rəsmi cəhətdən, rəsmiyyət nöqteyi-nəzərdən, zahiri rəsmiyyət xatirinə; **to support *smth.* ~** bir şeyi formal olaraq müdafiə etmək; 3. səthi; zahiri baxımdan

**format** [ˈfɔ:mæt] *n* 1. format *(kitabda)*; 2. əndazə, ölçü; forma, nümunə; **a stamp of triangular ~** üçbucaqlı/üçkünc marka; 3. xarakter, forma, növ; *The format of the new show included music and comedy Tamaşanın yeni variantına həm musiqi, həm də komediya daxil edilib;* **exercises to acquaint students with the ~ of the tests** tələbələri testlərin xarakteri ilə tanış etmək məqsədi daşıyan tapşırıqlar

**formation** [fɔ:ˈmeɪʃn] *n* 1. təşkil/təsis etmə, düzəltmə, yaratma, tərtib etmə; **the ~ of a new word** yeni sözün düzəldilməsi; **the ~ of a committee** komissiyanın yaradılması; **the ~ of a government** hökumətin yaradılması; 2. quruluş, struktur; konstruksiya *(tikintinin, maşının və s. quruluşu)*; **the ~ of a flower** gülün quruluşu; 3. *d.y.* düzəltmə, quraşdırma *(qatarı)*; 4. *hərb.* sıraya durma/düzülmə; cərgə, sıra, səf, nizam, düzülüş; döyüş intizamı; **~ in depth** eşelonlaşdırma, eşelon-eşelon yerləşdirmə

**formed** [fɔ:md] *adj* 1. təşkil edilmiş/olunmuş, düzəldilmiş, yaradılmış, yetkin, kamil; 2. müəyyən, qəti; **~ intention** müəyyən niyyət; 3. budanmış *bağç.* **~ tree** budanmış ağac

**former** [ˈfɔ:məʳ] *adj* 1. əvvəlki, qabaqkı, keçmiş, bundan əvvəlki; ötmüş, ötüb keçmiş, keçən; çoxdankı; **in ~ times** keçmiş zamanlarda; **on ~ occasions** əvvəllər, keçmişdə, qabaqlar; **the ~ part of the discourse** çıxışın əvvəlki hissəsi; 2. **(the ~)** birinci *(iki nəfərdən)*; *Of these two evils the former is the less İki bəladan birincisi daha kiçikdir*

**formerly** [ˈfɔ:məlɪ] *adv* əvvəllər, keçmişdə, qabaqlar; vaxtilə, bir vaxtlar, bir vaxt; çoxdan

**formidable** [ˈfɔ:mɪdəbl] *adj* 1. vahiməli, qorxulu, qəzəbli, qorxunc; **~ appearance** qorxulu/vahiməli görünüş; 2. çox çətin; **~ task** çox çətin tapşırıq; *The examination papers contained several formidable questions İmtahan biletlərində bir sıra çox çətin suallar vardı;* 3. böyük, qüvvətli; **~ army** qüvvətli/böyük ordu

**formidably** [ˈfɔ:mɪdəblɪ] *adv* 1. qəzəblə, hiddətlə, vahiməli/qorxunc bir halda; 2. son dərəcə; *She's formidably well-read O son dərəcə məlumatlıdır/savadlıdır*

**forming** [ˈfɔ:mɪŋ] *n* 1. təşkil etmə, düzəltmə, yaratma, törətmə, quraşdırma; 2. sıraya düzmə

**formless** [ˈfɔ:mlɪs] *adj* formasız, şəkilsiz, biçimsiz, yayğın; amorf; qeyri-müəyyən, müəyyən/aydın olmayan formalı; **~ mass** qeyri-müəyyən/amorf kütlə

**form master** [ˈfɔ:mˌma:stəʳ] *n* sinif rəhbəri

**formula** [ˈfɔ:mjulə] *(pl* **-lae***)* *n* 1. formul, düstur; **legal ~** hüquq formulu; *"Yours truly" is a formula used in letters "Səmimiyyətlə sizin..." məktublarda işlədilən formuldur;* **empirical/structural ~** empirik/struktur formula; *They sought a formula that would allow settling of the dispute Mubahisəni həll etmək üçün onlar formul axtardılar;* 2. südlü xörək *(südəmər uşaqlar üçün)*; uşaq yeməyi; 3. *din.* ehkam; 4. şablon, stereotip; **~ paintings** standart/ şablon rəsmlər

**formularise** [ˈfɔ:mjuləraɪz] = **formularize**

**formularize** [ˈfɔ:mjuləraɪz] *v* düstur şəklində qısaca ifadə/təqdim etmək

**formulary**$^{1}$ [ˈfɔ:mjulərɪ] *n* 1. soraq /arayış kitabçası *(xüs. əczaçılığa dair)*; 2. *din.* dua kitabı; 3. qaydalar/qanunlar külliyyatı; 4. **~ of the match** *id.* yarışın protokolu

**formulary**$^{2}$ [ˈfɔ:mjulərɪ] *adj* 1. düsturla ifadə olunmuş, düstur şəklində təqdim olunmuş; 2. qaydalarla/qanunlarla göstərilmiş *(yazılı surətdə)*; 3. formalizmə meylli

**formulate** [ˈfɔ:mjuleɪt] *v* 1. qısaca və dürüst ifadə etmək; **to ~ a proposal** təklifi qısa və dürüst ifadə etmək; **to ~ a scientific theory** elmi nəzəriyyəni qısa və dürüst ifadə etmək; 2. düsturla ifadə etmək

**formulation** [ˌfɔ:mjuˈleɪʃn] *n* qısaca və dürüst ifadə / xülasə etmə; xülasə edilmiş fikir; **final ~** son redaksiya *(redaktə etmə)*

**formulization** [ˌfɔ:mjulaɪˈzeɪʃn] *n* = **formulation**

**formulize** [ˈfɔ:mjulaɪz] *v* = **formulate**

**form-word** [ˈfɔ:mwə:d] *n dilç.* köməkçi nitq hissəsi

**fornicate** [ˈfɔ:nɪkeɪt] *v* kəbinsiz cinsi əlaqəyə girmək

**fornication** [ˌfɔ:nɪˈkeɪʃn] *n* kəbinsiz cinsi əlaqəyə girmə

**fornicator** [ˈfɔ:nɪkeɪtəʳ] *n* kəbinsiz cinsi əlaqəyə girən kişi

**fornicatress** [ˈfɔ:nɪkeɪtrɪs] *n* kəbinsiz cinsi əlaqəyə girən qadın

**forsake** [fəˈseɪk] *v (pt* **forsook** [fəˈsuk]; *pp* **forsaken** [fəˈseɪkən]) 1. atmaq, atıb getmək, buraxmaq, buraxıb getmək; **to ~ *one's* old friends / *one's* family** köhnə dostlarını/ailəsini atıb getmək; 2. əl çəkmək, buraxmaq, tərk etmək *(bir şeyi)*; imtina etmək, üz döndərmək *(bir şeydən)*; **to ~ *one's* post** vəzifəsini tərk etmək; **to ~ a habit / *one's* former way of life** adətdən / əvvəlki həyat tərzindən əl çəkmək; **to ~ *one's* principles** öz prinsiplərindən əl çəkmək/üz döndərmək

**forsaken** [fəˈseɪkn] *adj* tərk edilmiş, atılmış; unudulmuş, tək-tənha qalmış; **~ house** tərk edilmiş ev; **~ friend** atılmış dost

**forslow** [fəˈslou] *v arx.* 1. ləngitmək, yubatmaq, uzatmaq, gecikdirmək, süründürmək, yubanmaq, ləngimək, gecikmək; 2. yavaşıtmaq, sürətini azaltmaq; mane olmaq

**forspend** [fəˈspend] *v (pt, pp* **forspent** [fəˈspent]) xərcləmək; sərf etmək, işlətmək, tamamilə xərcləmək / sərf etmək; tükətmək, sərf edib qurtarmaq

**forswear** [fəˈsweəʳ] *v (pt* **forswore** [fɔ:ˈswɔ:ʳ]; *pp* **forsworn** [fɔ:ˈswɔ:n]) 1. boyun qaçırmaq, imtina etmək, dönmək, üz döndərmək, əl çəkmək; **to ~ bad habits** pis adətlərdən imtina etmək/əl çəkmək; **to ~ smoking** papiros çəkməkdən imtina etmək; **to ~ a debt** borcu ödəməkdən imtina etmək; 2. rədd etmək, qəbul etməmək, and içərək danmaq/ inkar etmək; 3. (*həm də* **to ~ oneself**) yalançı şahidlik etmək, yalandan şəhadət vermək; andı pozmaq

**forsworn** [fəˈswɔ:n] *adj* 1. dönən, üz döndərən, əl çəkən; 2. yalançı şahidlik edən, yalandan şəhadət verən

**forte-piano** [ˌfɔ:tɪˈpjænou] *n* fortepiano *(pianinonun bir növü)*

**forth** [fɔ:θ] *adv* 1. irəli, sonra, daha sonra; **back and ~** həm o yana, həm bu yana; hər cürə; 2. gələcəkdə, bundan sonra, bundan belə; bir daha; **from that day ~** o gündən belə; 3. *birləşmələrdə:* **and so ~** və ilaxır, və sair; **so far ~** nə qədər, nə dərəcədə

**forthcome** [fɔ:θˈkʌm] *v (pt* **forthcame** [ˈfɔ:θkeɪm]; *pp* **forthcome** [ˈfɔ:θkʌm]) *arx.* yaxınlaşmaq, çatmaq, gəlmək, çökmək

**forthcoming**$^{1}$ [ˈfɔ:θˈkʌmɪŋ] *n* yaxınlaşma, gəlib çıxma, görünmə, zahir / peyda olma

**forthcoming**$^{2}$ [ˈfɔ:θˈkʌmɪŋ] *adj* 1. qarşıdakı, qarşıda/qabaqda duran, gözlənən; gələcək, gələn;

gözlənilən, yaxınlaşan; **a list of ~ works** çıxacaq əsərlərin siyahısı; **a ~ book** çap ediləcək kitab; 2. **to be ~** tezliklə/tez bir zamanda gəlmək, görünmək, zahir olmaq; gözlənilmək *(yaxın zamanda); At last the truth is forthcoming Nəhayət həqiqət özünü büruzə verir; The answer is forthcoming Cavab gözlənilir*; 3. xoşrəftar, ünsiyyətli, mülayim, nəzakətli, ədəbli, mərifətli

**forthright[1]** ['fɔ:θraɪt] *adj* ürəyiaçıq, səmimi, açıq, düz, doğru; təmiz, vicdanlı, namuslu, sədaqətli; ~ **word** açıq söz; *He has a reputation for being a forthright critic Səmimi/Vicdanlı tənqidçi olduğu üçün o, şöhrət qazanıb*

**forthright[2]** [fɔ:θ'raɪt] *adv* 1. düz, düzünə, açıq, açıqdan-açığa, üzünə; 2. cəsarətlə, əzmlə, qətiyyətlə, qəti surətdə; 3. dərhal, əlüstü, o saat

**forthwith** ['fɔ:θwɪð] *adv* həmin saat, dərhal, tez, bilatəxir, cəld, dayanmadan, gecikdirmədən, təxirsiz, tezliklə

**forties** ['fɔ:tɪz] *n pl* 1. qırxdan qırx doqquza qədər olan rəqəm; 2. (**the** ~) qırxıncı illər; 3. qırxdan qırx doqquza qədər yaş; *He is in the early / in the late forties Onun yaşı qırx beşdən azdır/artıqdır*

**fortieth** ['fɔ:tɪɪθ] *adj* qırx, qırxıncı; *He is in his fortieth O qırx yaşındadır; He arrived fortieth O, qırxıncı gəldi*

**fortification** [ˌfɔ:tɪfɪ'keɪʃn] *n* 1. *hərb.* istehkam elmi *(bir yeri müharibə üçün istehkam halına gətirmək üsulları haqqında hərbi mühəndislik elmi)*: istehkam/qala; 2. *pl* möhkəmlətmə, möhkəmlənmə, bərkitmə; bərkimə; 3. spirt qatma *(şəraba)*; zənginləşdirmə, qidalılığı artırma; vitaminləşdirmə *(məhsulları)*

**fortified** ['fɔ:tɪfaɪd] *adj* 1. *hərb.* bərkidilmiş, möhkəmləndirilmiş, istehkam şəklinə salınmış; ~ **area/zone** möhkəmləndirilmiş rayon/sahə / zona; 2. spirt qatılmış *(şərab/çaxır haq.)*; 3. zənginləşdirilmiş; vitaminləşdirilmiş *(qida maddələri haq.)*; ~ **milk** zənginləşdirilmiş süd *(vitamin, mineral maddələr və s. əlavə etməklə)*

**fortifier** ['fɔ:tɪfaɪə$^r$] *n* istehkam inşaatçısı

**fortify** ['fɔ:tɪfaɪ] *v* 1. möhkəmləndirmək, bərkitmək, gücləndirmək; **to ~ a barrel with iron hoops** çəlləyi/boçkanı dəmir çənbərlərlə bərkitmək; 2. *hərb.* istehkam xətti düzəltmək, müdafiə vasitələri ilə təmin etmək; **to ~ a town / a position** şəhəri / mövqeyi müdafiə vasitələri ilə təmin etmək; 3. müdafiə etmək, kömək göstərmək/etmək; **to ~ *smb.* for a hard task** çətin tapşırığı yerinə yetirmək üçün bir kəsi ürəkləndirmək; 4. doğru olduğunu sübut etmək, əsaslandırmaq, qüvvətləndirmək; **to ~ *one's* statement with facts** bəyanatını/fikrini faktlarla əsaslandırmaq; 5. spirtləmək, spirt əlavə etmək *(çaxıra)*; 6. zənginləşdirmək, vitaminləşdirmək *(qida məhsullarını)*

**fortitude** ['fɔ:tɪtju:d] *n* səbat, mətanət, möhkəmlik, davamlılıq, dözüm, dayanıqlılıq, sarsılmazlıq, yenilməzlik; **to bear *smth.* with ~** bir şeyə mətanətlə dözmək / tab gətirmək

**fortitudinous** [ˌfɔ:tɪ'tju:dɪnəs] *adj* möhkəm, davamlı, dözümlü, mətin, sarsılmaz, yenilməz, cəsarətli, qoçaq, igid

**fortnight** ['fɔ:tnaɪt] *n* iki həftə, on dörd gün; **in a ~** iki həftədən sonra; **to-day ~** düz iki həftədən sonra; **this ~** axırıncı / sonrakı iki həftə

**fortnightly[1]** ['fɔ:tˌnaɪtlɪ] *n* iki həftəlik məcmuə; iki həftədə bir çıxan jurnal

**fortnightly[2]** ['fɔ:tˌnaɪtlɪ] *adj* 1. iki həftəlik, iki həftədə bir çıxan; ~ **magazine** iki həftədə bir çıxan jurnal; ~ **meeting** iki həftədə bir keçirilən iclas

**fortnightly[3]** ['fɔ:tˌnaɪtlɪ] *adv* iki həftədə bir; **to write a letter ~** iki həftədə bir məktub yazmaq

**fortress** ['fɔ:trɪs] *n* qala

**fortuitous** [fɔ:'tju:ɪtəs] *adj* təsadüfi, gözlənilməyən; ~ **meeting** təsadüfi görüş

**fortuitously** [fɔ:'tju:ɪtəslɪ] *adv* təsadüfi olaraq, təsadüfən, təsadüfi; bilmədən

**fortuity** [fɔ:'tju:ɪtɪ] *n* təsadüfilik, təsadüfi olma; təsadüf, təsadüfi vəziyyət

**fortunate** ['fɔ:tʃnɪt] *adj* 1. bəxtli, xoşbəxt, bəxtiyar; uğurlu, bəxti gətirən; ~ **event** xoşbəxt hadisə; **the ~ possessor of this masterpiece** bu şah əsərin xoşbəxt sahibi; *How fortunate that I have found you today Nə yaxşı ki, mən səni/sizi bu gün axtarıb tapdım; He is fortunate in life Həyatda onun bəxti gətirir*; 2. bəxtli, münasib, yararlı, əlverişli, uğurlu, xoşbəxt, müvafiq; ~ **day for doing *smth.*** bir iş görmək üçün əlverişli/münasib gün; **born under a ~ star** xoşbəxt ulduz altında doğulmuş, bəxti üzünə gülən, bəxti gətirən

**fortunately** ['fɔ:tʃnɪtlɪ] *adv* 1. xoşbəxtliklə, xoşbəxtanə; salamat, sağ-salamat; 2. xoşbəxtlikdən, yaxşı ki, çox şükür ki; *Fortunately, I remembered his address Xoşbəxtlikdən mən onun ünvanını xatırladım*

**fortune** ['fɔ:tʃn] *n* 1. bəxt, səadət, xoşbəxtlik; müvəffəqiyyət, uğur; **bad/ill ~** bədbəxtlik, fəlakət, müvəffəqiyyətsizlik, uğursuzluq; **by good ~** xoş təsadüfdən; **to seek *one's* ~** səadətini axtarmaq; **to try *one's* ~** bəxtini sınamaq; **to push *one's* ~** müvəffəqiyyət əldə etmək, mənsəbə çatmaq; 2. tale, qismət, nəsib; **to tempt ~** taleyi/bəxti sınamaq; *Fortune favours the brave Tale cəsur adamların üzünə gülür*; **to tell ~s/to read *smb.'s* ~** bir kəsin falına baxmaq, taleyi qabaqcadan xəbər vermək; 3. dövlət, var, sərvət; **a man of ~** varlı adam; **to make a ~** varlanmaq, dövlətlənmək, var-dövlət toplamaq/qazanmaq; **to lose a ~** var-yoxdan çıxmaq,



dilənçi halına düşmək; **to marry *smb.* for a ~** var-dövlət xatirinə bir kəslə evlənmək;

◊ *Fortune is variant Tale dəyişkəndir; Fortune is easily found, but hard to keep at. söz.* ≅ *Xoşbəxtliyi tapmaq asan, əldə saxlamaq çətindir*

**fortune-book** ['fɔ:tʃnbuk] *n* fal kitabı, fal açmaq üçün kitab

**fortuned** ['fɔ:tʃnd] *adj* 1. xoşbəxt, uğurlu, bəxti gətirən, bəxtəvər; 2. varlı

**fortuneless** ['fɔ:tʃnlɪs] *adj* 1. bədbəxt, bəxtsiz, uğursuz, işi gətirməyən; 2. kasıb, yoxsul; 3. cehizsiz, cehizi olmayan

**fortune-tell** ['fɔ:tʃntel] *v* fal açmaq, fala baxmaq, gələcəyi qabaqcadan xəbər vermək; cadu etmək, ovsunlamaq

**fortune-teller** ['fɔ:tʃn'telə$^r$] *n* falçı, falabaxan, cadugər, ovsunçu, qabaqcadan/gələcəkdən xəbər verən

**fortune-telling** ['fɔ:tʃn'telɪŋ] *n* fal açma, fala baxma, fal, sehr, cadu, ovsun; gələcəkdən xəbər vermə

**forty** ['fɔ:tɪ] *num* 1. qırx; ~ **books** qırx kitab; **a man of ~** qırx yaşlı kişi; *He is forty O, qırx yaşındadır*; 2. qırxıncı; **chapter ~** qırxıncı fəsil; **Room ~** qırxıncı otaq

**forum** ['fɔ:rəm] *n* 1. forum; **the Forum** Roma forumu; 2. məhkəmə; **the ~ of conscience** vicdan/ictimai fikir məhkəməsi; 3. qurultay, yığıncaq, toplanış; diskussiya, müzakirə, disput *(elmi mübahisə / müzakirə)*

**forward[1]** ['fɔ:wəd] *n id.* hücumçu *(oyunda)*; **centre ~** mərkəz hücumçusu

**forward[2]** ['fɔ:wəd] *adj* 1. qabaq, ön; qabaqdakı, irəlidə/qabaqda/başda gedən, öncül; ~ **echelon** *hərb.* birinci / qabaqda gedən eşelon; 2. qabaqcıl, mütərəqqi; ~ **magazine** mütərəqqi jurnal; ~ **movement** mütərəqqi hərəkat; 3. əlaçı, görkəmli, məşhur; ~ **pupil** əlaçı şagird; 4. vaxtından əvvəl, həmişəkindən tez gələn/girən/başlayan; ~ **spring** tez girən yaz; **to be ~ with *one's* work** işi vaxtından əvvəl yerinə yetirmək; 5. radikal, qəti, təsirli, kəsərli; 6. hazır, can atan *(bir şey etmək üçün)*; **to be ~ to assist** kömək etməyə hazır olmaq/can atmaq

**forward[3]** ['fɔ:wəd] *v* 1. kömək etmək, imkan yaratmaq; sürətləndirmək, tezləşdirmək; **to ~ a plan** planı tezləşdirmək; **to ~ the growth of a plant** bitkinin inkişafını tezləşdirmək/sürətləndirmək; 2. vəzifədə irəli çəkmək; **to ~ *smb.* in rank** bir kəsin rütbəsini artırmaq; 3. göndərmək, yollamaq, yola salmaq; **to ~ goods** malı/əmtəəni təyinatı üzrə göndərmək; 4. göndərmək *(bir yerdən başqa yerə)*; **to ~ letters to a new address** məktubu yeni ünvana göndərmək

**forward[4]** ['fɔ:wəd] *adv* 1. irəli; 2. sonra, daha sonra, daha, artıq; *Forward! İrəli!*; **to go ~** davam etdirmək/etmək; **to send ~** irəli göndərmək; **to put ~** qabağa / irəli çəkmək, irəli sürmək; **to bring ~ an opinion** fikir söyləmək; **to date ~** keçmiş tarix qoymaq;

◊ **to look ~ to *smth.*** bir şeyin intizarını çəkmək; **to put / to set oneself ~** özünü çəkmək, lovğalanmaq; özü haqqında yüksək fikirdə olmaq

**forwarder** ['fɔ:wədə$^r$] *n* 1. ekspeditor *(mal göndərməklə məşğul olan işçi)*; 2. *tex.* transportyor (1) *tex. konveyer*; 2) *qarajda avtomobilin yerini dəyişdirmək üçün xüsusi qurğu)*; 3. cildçi

**forwarding** ['fɔ:wədɪŋ] *n* 1. göndərmə, yollama, yola salma; 2. sürətləndirmə, sürətini artırma; irəliləyiş

**forward-looking** ['fɔ:wəd'lukɪŋ] *adj* 1. işinin dalını-qabağını düşünən, ehtiyatlı, tədbirli, uzaqgörən, gələcəyi görən; 2. mütərəqqi, novator, yenilikçi, yenilik gətirən, yenilik yaradan / tətbiq edən

**forwardness** ['fɔ:wədnɪs] *n* 1. erkən inkişaf etmə, boy atma, inkişaf, irəliləmə; **the ~ of the crops** məhsulun erkən inkişafı/tez boy atması; **the ~ of a child** uşağın tez /sürətli inkişafı; 2. hazırlıq, hazır olma, can atma

**forwards-area** ['fɔ:wədz'eərə] *n id.* hücum zonası

**forworn** [fɔ:'wɔ:n] *adj arx. şair.* yorğun, əldən / haldan düşmüş, üzgün, tabsız

**foster** ['fɔstə$^r$] *v* 1. tərbiyə vermək / etmək; ədəb öyrətmək, böyütmək; **to ~ a child** uşaq tərbiyə etmək, uşağı böyütmək; 2. qulluq etmək, baxmaq; **to ~ the sick** xəstəyə qulluq etmək/baxmaq; 3. bəsləmək; **to ~ hope** ümid bəsləmək; **to ~ a desire for revenge** intiqam fikri ilə yaşamaq; 4. kömək etmək, şərait yaratmaq, inkişafa imkan yaratmaq; həvəsləndirmək, rəğbətləndirmək; **to ~ artistic talent** bədii istedadın inkişafına imkan yaratmaq

**fosterage** ['fɔstərɪdʒ] *n* 1. başqasının uşağını tərbiyə etmə; 2. uşağı tərbiyə edilməyə vermə; 3. həvəsləndirmə, rəğbətləndirmə

**foster-brother** ['fɔstəˌbrʌðə$^r$] *n* süd qardaşı

**foster-child** ['fɔstətʃaɪld] *n* övladlıq, oğulluq, qızlıq

**foster-daughter** ['fɔstəˌdɔ:tə$^r$] *n* qızlıq

**fosterer** ['fɔstərə$^r$] *n* 1. dayə; ailə başçısı olan qadın; 2. tərbiyəçi, tərbiyə verən; atalıq; analıq

**foster-father** ['fɔstəˌfa:ðə$^r$] *n* atalıq

**foster-mother** ['fɔstəˌmʌðə$^r$] *n* 1. dayə; ailə başçısı olan qadın; 2. analıq; 3. *k.t.* bruder *(inkubatordan çıxmış cücələri və başqa ev quşlarını isti saxlamaq üçün cihaz)*

**foster-sister** ['fɔstəˌsɪstə$^r$] *n* bacılıq

**foster-son** ['fɔstəsʌn] *n* oğulluq

**foul[1]** [faul] *n* 1. pis, çirkli şey; 2. toqquşma, döyüş *(qayıqlar, atlılar və s. haq.)*; 3. *id.* oyun qaydasının pozulması; **to claim a ~** cərimə, cərimə zər-

bəsi və s. təyin edilməsini tələb etmək *(rəqib tərəfindən oyunun qaydası pozulduqda)*; səhv

**foul**[2] [faul] *adj* 1. çirkli, çox pis, çirkin, iyrənc; ~ **hovel** çirkli daxma/koma; ~ **linen** çirkli dəyişək/alt paltarı; ~ **rags** çirkli/ cındır paltar; cır-cındır, əsgi-üsgü; 2. üfunətli, pis, iyrənc; ~ **smell** üfunətli qoxu/ iy; 3. zibillənmiş, çirklənmiş, tutulmuş; ~ **chimney** his ilə tutulmuş boru/ baca; ~ **sewer** tutulmuş su axıdan boru; 4. çirkli, çirklənmiş; ~ **air** çirkli hava; ~ **water** çirkli su; 5. alçaq, abırsız; ~ **crime** alçaq cinayət; ~ **motive** alçaq niyyət; ~ **deed** alçaq hərəkət; 6. *id.* qaydadan kənar, yanlış, düzgün / doğru olmayan, səhv; 7. boranlı, tufanlı, küləkli *(hava haq.)*; əlverişsiz, yaramayan / təhlükəli *(üzgüçülük / gəmi səfəri üçün)*;
◊ ~ **blow** xaincəsinə zərbə; qadağan edilmiş zərbə *(boksda)*

**foul**[3] [faul] *v* 1. çirklətmək, kirlətmək, bulamaq, ləkələmək, batırmaq; çirklənmək, bulanmaq, ləkələnmək, kirlənmək, batmaq; 2. zibilləmək, tutmaq; zibillənmək, tutulmaq, yolu tutulmaq; *Grease often fouls sink drains Su boruları tez-tez yağdan-piydən tutulur;* 3. hörmətdən/etibardan/nüfuzdan salmaq, bədnam etmək *(bir kəsi)*; **to ~ smb.'s name/reputation** bir kəsin adını/ şərəfini ləkələmək; 4. mane olmaq *(hərəkətə)*, basırıq yaratmaq; toqquşmaq; *The two boats fouled İki gəmi toqquşdu;*
◊ **to ~ one's hands with smth.** 1) əlini bir şeylə çirkləndirmək; 2) alçalmaq, bir şeylə özünü alçaltmaq

**foul**[4] [faul] *adv* şərəfsizcəsinə;
◊ **to hit** ~ qadağan edilmiş zərbə endirmək *(boksda)*; **to play smb.** ~ bir kəsi aldatmaq / satmaq /ələ vermək

**foully** ['faulı] *adv* 1. çirkli / kirli halda, çox pis; təhqiredici bir şəkildə, həqarətlə; ~ **slandered** alçaqcasına böhtana/şərə düşmüş, iftira edilmiş, ləkələnmiş; 2. xaincəsinə, satqıncasına, rəhmsizcəsinə, amansızcasına, insafsızcasına; ~ **murdered** xaincəsinə öldürülmüş; **to swear** ~ satqıncasına/xaincəsinə and içmək

**foul-up** ['faulʌp] *n d.d.* 1. çətin vəziyyət; **to be in a** ~ çətin vəziyyətdə olmaq; 2. tıxac, manеə, tıxanma

**found**[1] [faund] **to find** *felinin pt, pp formaları*

**found**[2] [faund] *v* I 1. əsasını qoymaq, təsis/ təşkil etmək, qurmaq; **to ~ a college/a hospital** kollecin/xəstəxananın əsasını qoymaq, kollec/xəstəxana təsis etmək; 2. yaratmaq, banisi olmaq; **to ~ a theory/a system of philosophy** nəzəriyyə/fəlsəfi sistem yaratmaq; 3. əsaslandırmaq, əsas götürmək; **to be ill / well ~ed** pis / yaxşı əsaslandırılmış olmaq; **to ~ a novel on old legends** köhnə əfsanələri/rəvayətləri roman üçün əsas götürmək; *His conclusion is founded on very superficial knowledge Onun çıxartdığı nəticələr səthi biliyə əsaslanır* ;
◊ **to ~ a family** ailənin ulu babası/əcdadı/ soybaşı/ banisi olmaq

**found** [faund] *v* II 1. əritmək; əridib ayırmaq *(metalı)*; **to ~ iron / steel** çuqunu / poladı əritmək; 2. tökmək, tökmə üsulu ilə hazırlamaq; **to ~ a bell/a gun** tökmə üsulu ilə zəng / top hazırlamaq; 3. şüşə əritmək

**foundation** [faun'deıʃn] *n* 1. bünövrə qoyma *(şəhərin və s.)*; təməl/özül qoyma; *The foundation of London took place at an unknown date Londonun əsasının qoyulma tarixi naməlumdur;* 2. özül, bünövrə, bina, təməl, əsas; **to lay the ~(s) of smth.** bir şeyin özülünü/əsasını qoymaq; *The rumour is without foundation Bu şayiənin əsası yoxdur;* 3. *pl* prinsiplər; əsaslar; **the ~s of the theory** nəzəriyyənin əsasları; 4. təşkil/təsis etmə, düzəltmə; təsis, təşkil, təsisat; **the ~ of a library** kitabxana təşkil/ təsis etmə

**foundationless** [faun'deıʃnlıs] *adj* əsassız, dəlilsiz, sübutsuz, əsası olmayan

**foundation-stone** [faun'deıʃnstoun] *n tik.* təməl daşı; **to lay the** ~ binanın təməl daşını qoymaq

**founder**[1] ['faundəʳ] *n* I bani, müəssis *(bir şeyin əsasını/özülünü/bünövrəsini qoyan adam)*, təsisçi; **the ~ of a city** şəhərin bünövrəsini qoyan adam; *Mohammed was the founder of the Muslim religion Məhəmməd müsəlman dininin banisi olmuşdur*

**founder** ['faundəʳ] *n* II 1. əridici, metal əridən *(fəhlə, mütəxəssis)*; 2. tökməçi *(metal tökən fəhlə)*

**founder**[2] ['faundəʳ] *v* 1. axsamaq, axsaq olmaq, ayağını qırmaq/sındırmaq *(at haq.)*; 2. yıxılmaq *(yorğunluqdan)*; 3. bataqlıqda batmaq, batıb qalmaq *(at haq.)*; 4. çökmək, enmək, yatmaq *(bina haq)*; 5. məhv/ həlak olmaq, iflasa uğramaq, sınıq çıxmaq

**foundling** ['faundlıŋ] *n* atılmış/tapılmış uşaq

**foundling-hospital** ['faundlıŋ'hɔspıtl] *n* yetimxana *(atılmış uşaqlar üçün)*

**foundry** ['faundrı] *n* tökmə sexi; ~ **hand / man** tökməçi *(metal tökən fəhlə)*; ~ **work** tökmə işi

**fountain** ['fauntın] *n* 1. fəvvarə, fontan; **to put up/to build a** ~ fəvvarə tikmək/qurmaq; *The fountain is playing Fontan fəvvarə vurur;* 2. çayın mənbəyi; bulaq, çeşmə

**fountain-head** ['fauntın'hed] *n* 1. bulaq, çeşmə; 2. ilk/birinci/əsas mənbə; **to go to the** ~ ilk mənbəyə müraciət etmək; **to trace an error to its** ~ səhvin əsas mənbəyini tapmaq

**fountainlet** ['fauntınlıt] *n* kiçik fontan/fəvvarə

**fountain-pen** ['fauntınpen] *n* avtomat qələm

**fountful** ['fauntful] *adj şair.* bulaqlarla/çeşmələrlə bol olan



**four** [fɔ:ʳ] *num* 1. dörd; *Four and four make eight Dörd üstəgəl dörd səkkiz eylər; She is four Onun dörd yaşı var;* **at** ~ dörd yaşında; **a girl of** ~ dörd yaşlı qız; *She will come at four O, saat dörddə gələcək; There were four of them Onlar dörd nəfər idilər;* 2. dördüncü; **chapter** ~ dördüncü fəsil; **Room** ~ dördüncü otaq; *Twenty is four times as much as five İyirmi dörd dəfə beşdən çoxdur*

**four-cornered** ['fɔ:'kɔ:nəd] *adj* dördbucaqlı, dördkünclü

**four-course**['fɔ:'kɔ:s] *adj* 1. *k.t.* dördtarlalı; ~ **system** dördtarlalı sistem *(tarlaçılıqda)*; 2. dörd yeməkdən ibarət; ~ **dinner** dörd yeməkdən ibarət nahar

**four-flusher** ['fɔ:'flʌʃəʳ] *n amer. jarq.* yalançı, adamaldadan, hiyləgər, bic, kələkbaz, fırıldaqçı, cüvəllağı

**four-footed** ['fɔ:futıd] *adj* dördayaqlı; ~ **beasts** dördayaqlı heyvanlar

**four-handed** ['fɔ:'hændıd] *adj* 1. dördəlli *(meymunlar haq.)*; 2. dörd adam üçün *(oyun haq.)*; 3. dörd əllə çalınan *(royal haq.)*

**four-horse** ['fɔ:'hɔ:s] *adj* = **four-horsed**

**four-horsed** ['fɔ:'hɔ:st] *adj* dörd at qoşulmuş, dördatlı

**four-letter word** ['fɔ:letə'wə:d] *n* nalayiq söz, söyüş

**four-oar** ['fɔ:rɔ:ʳ] *n* iki cüt avarlı/dördavarlı qayıq

**four-oared** ['fɔ:r(')ɔ:d] *adj* dördavarlı; ~ **boat** dördavarlı qayıq

**four-row** ['fɔ:'rou] *adj* = **four-rowed**

**four-rowed** ['fɔ:'roud] *adj* dördsıralı

**four-seater** ['fɔ:'si:təʳ] *n d.d.* dördyerli avtomobil

**four-square** ['fɔ:'skweəʳ] *n riyaz.* kvadrat

**fourteen** ['fɔ:'ti:n] *num* 1. on dörd; *Fourteen and fourteen make twenty eight On dörd üstəgəl on dörd iyirmi səkkiz eylər; There were fourteen of them Onlar on dörd nəfər idilər;* 2. on dördüncü; **chapter** ~ on dördüncü fəsil; **Room** ~ on dördüncü otaq; **at** ~ on dörd yaşında; **a boy of** ~ on dörd yaşlı oğlan; *He is fourteen Onun on dörd yaşı var;*
◊ ~ **night** iki həftə

**fourteener** ['fɔ:'ti:nəʳ] *n* 1. on dörd sətirlik şer; 2. *d.d.* on dörd yaşlı uşaq/oğlan / qız

**fourteenth** ['fɔ:'ti:nθ] *adj* on dördüncü *(sıra ilə)*

**fourth** [fɔ:θ] *adj* dördüncü; ~ **form** dördüncü sinif *(məktəbdə)*; *He is doing it for the fourth time O bunu dördüncü dəfə edir*

**fourthly** ['fɔ:θlı] *adv* dördüncüsü

**fourth-rate** ['fɔ:θ'reıt] *adj* dördüncü sort/ növ

**four-wheel** ['fɔ:'wi:l] *adj* dördtəkərli

**fowl**[1] [faul] *n* 1. ev quşu *(xüs. toyuq)*; **to breed / to rear ~s** toyuq yetişdirmək; **to keep ~s** quş/toyuq saxlamaq; 2. *amer.* ördək, qaz, loş, hindxoruzu, erkək hinduşka; 3. quş əti

**fowl**[2] [faul] *v* 1. quş ovlamaq; 2. quş tutmaq

**fowler** ['fauləʳ] *n* quştutan *(oxuyan quşları tutmaqla məşğul olan adam)*, ovçu

**fowl-farm** ['faulfa:m] *n* quşçuluq ferması

**fowling-piece** ['faulıŋpi:s] *n* 1. ov tüfəngi; 2. quş şəkli, quş şəkli olan natürmort

**fowl-run** ['faulrʌn] *n* quş damı, quşxana

**fox**[1] [fɔks] *n* 1. tülkü, erkək tülkü; **to hunt the** ~ tülkü ovlamaq, tülkü ovuna çıxmaq; 2. tülkü xəzi; 3. *pl* tülkü xəzindən düzəldilmiş məmulatlar; 4. *məc.* hiyləgər, kələkbaz, bic, tülkü;
◊ **to play the** ~ biclik/hiylə/hiyləgərlik etmək, hiylə işlətmək, zirəklik göstərmək

**fox**[2] [fɔks] *v d.d.* aldatmaq, ələ salmaq, oynatmaq, axmaq yerinə qoymaq; cəld/bacarıqla hərəkət etmək; **to ~ smb. by pretending to be ill** özünü xəstə yerinə qoymaqla bir kəsi aldatmaq

**fox-brush** ['fɔksbrʌʃ] *n* tülkü quyruğu

**fox-chase** ['fɔkstʃeıs] *n* = **fox-hunt**

**fox-colour** ['fɔks.kʌləʳ] *n* qırmızımtıl-sarı/ kürən rəng

**fox-cub** ['fɔkskʌb] *n* tülkü balası

**fox-earth** ['fɔksə:θ] *n* tülkü yuvası

**foxery** ['fɔksərı] *n* hiyləgərlik, biclik, hiylə, fənd, hər yerə özünü soxma xasiyyəti, diribaşlıq, cəldlik, zirəklik, çeviklik, fəndgirlik, bacarıq, fərasət

**fox-fur** ['fɔksfə:ʳ] *n* 1. tülkü xəzi; 2. tülkü xəzi ilə bəzədilmiş paltar

**foxhole** ['fɔkshoul] *n* tülkü yuvası

**fox-hunt** ['fɔkshʌnt] *n* tülkü ovu *(itlə)*, tülkü ovlama *(itlə)*

**fox-hunter** ['fɔks.hʌntəʳ] *n* tülkü ovçusu

**foxiness** ['fɔksınıs] *n* 1. tülkülük, hiyləgərlik, biclik, hiylə, fənd; 2. qonur-qırmızı rəng

**fox-like** ['fɔkslaık] *adj* 1. tülkü kimi, tülküyə oxşar; 2. hiyləgər, kələkbaz, fəndgir, bic; ~ **behaviour** bic rəftar / davranış

**fox-sleep** ['fɔkssli:p] *n* yalançı yuxu

**fox-trap** ['fɔkstræp] *n* tülkü tələsi

**fox-trot**[1] ['fɔkstrɔt] *n* fokstrot *(rəqs növü)*

**fox-trot**[2] ['fɔkstrɔt] *v* fokstrot oynamaq

**foxy** ['fɔksı] *adj* 1. tülkü; ~ **face** tülküsifət; 2. hiyləgər, kələkbaz, fəndgir, bic; 3. kürən, qonur-qırmızı; ~ **hair** kürən saç; 4. *amer. sl.* şəhvətli *(xüs. qadın haq.)*; **a ~ lady** şəhvətli qadın

**foyer** ['fɔıeı] *n fr.* foye *(teatrda, kinoda və s.-də tənəffüslərdə istirahət yeri)*

**fozy** ['fouzı] *adj* 1. məsaməli, deşik-deşik; yumşaq; boş; 2. rütubətli və isti *(hava haq.)*; 3. qanmaz, qanacaqsız, anlamaz, küt, fərasətsiz, kütbeyin, boş, axmaq, sarsaq

**fraction** ['frækʃn] *n* 1. kəsr; **common** ~ adi kəsr; **decimal** ~ onluq kəsr; 2. zərrəcik, zərrə, bir zər-

ro/az, cüzi miqdarda; **a ~ of a second** saniyənin bir anı; **not by a ~** heç, qətiyyən, əsla, zərrə qədər belə; **to a ~** *d.d.* tamamilə, tamam-kamal, büsbütün; **to suit to a ~** *d.d.* tamamilə yaraşmaq / yaramaq; **a ~ closer** bir az yaxın; kiçik bir hissə; **~ of distance** məsafənin kiçik bir hissəsi; 3. *siya.* fraksiya *(parlament və ya ictimai təşkilatda hər hansı bir partiya üzvlərinin mütəşəkkil dəstəsi yaxud partiya daxilində ayrılmış qrup)*

**fractional** ['frækʃənl] *adj* 1. xırdalanmış; parçalanmış; kiçik; xırda; **~ currency** xırda pul; xırda kupyuralar *(qiymətli kağızın ayrıca talonu)*; 2. natamam, yarımçıq; **~ load** *tex.* natamam/yarımçıq yük; 3. kiçik, balaca, cüzi; 4. *riyaz.* kəsr; 5. *siya.* fraksiyaçı

**fractionalism** ['frækʃənlızm] *n siya.* fraksiyaçılıq

**fractionalize** ['frækʃənlaız] *v* 1. hissələrə / qruplara / fraksiyalara bölmək; ayırmaq *(tərkibini)*; parçalamaq; 2. fraksiyaçı siyasət yeritmək

**fractionally** ['frækʃənlı] *adv* 1. qismən, natamam; 2. kiçik, balaca, cüzi

**fractionary** ['frækʃənrı] *adj* 1. = **fractional**; 2. xırdalanmış, parçalanmış, doğranmış; sınıq-sınıq, fraqment; 3. təfriqəçilik

**fractionate** ['frækʃəneıt] *v kim.* fraksiyalara ayırmaq

**fractionist** ['frækʃənıst] *n siya.* fraksiyaçı

**fractionize** ['frækʃənaız] *v* 1. dağılmaq, uçmaq; tərkib hissələrinə ayrılmaq/bölünmək, xırdalanmaq, parçalanmaq, paralanmaq, doğranmaq; 2. hissələrə bölmək; xırdalamaq, parçalamaq, paralamaq, doğramaq

**fractious** ['frækʃəs] *adj* şıltaqçı, şıltaq; tezacıqlanan, tezhirslənən, əsəbi; həyəcanlı, iztirablı, narahat, nadinc, qərarsız; **a ~ child** şıltaq uşaq; **a ~ person** tezhirslənən / əsəbi adam; **a ~ horse** harın at

**fracture**[1] ['fræktʃə'] *n* çat, çatlamış yer, yarıq; sınıq, sınıq yeri; **compound/simple ~** *tib.* açıq/örtülü sınıq; **~ of the skull** kəllədə çat

**fracture**[2] ['fræktʃə'] *v* 1. qırmaq, sındırmaq, çatlatmaq; **to ~ an arm/a thigh** qolunu/ ombasını qırmaq; **to ~ one's leg** qıçını qırmaq; **to ~ a pane of glass** şüşəni qırmaq; 2. qırılmaq, sınmaq; çatlamaq; *Under the blow the bone fractured Zərbədən sümük qırıldı/sındı*

**fractured** ['fræktʃəd] *adj* çatı / sınığı olan; sındırılmış, qırılmış; sınıq, qırıq; **~ rib** *tib.* qırılmış qabırğa

**frag bomb** ['fræg'bɔm] *n hərb. d.d.* qəlpəli bomba

**fragile** ['frædʒaıl] *adj* 1. kövrək, tezsınan, davamsız; **a ~ china** tezsınan çini qab; 2. kövrək, zəif; zərif, incə; **~ health** zəif səhhət; 3. keçici, səbatsız, tezdəyişən, müvəqqəti; **~ happiness** müvəqqəti xoşbəxtlik

**fragility** [frə'dʒılıtı] *n* 1. kövrəklik, zəriflik, zəiflik, incəlik, davamsızlıq; **~ of bones** sümüklərin kövrəkliyi; **an appearance of ~** zəiflik təəssüratı; 2. azömürlülük, az yaşama; qısalıq; keçən; **~ of life** həyatın davamsızlığı; **~ of beauty** gözəlliyin azömürlülüyü/qısalığı

**fragment** ['frægmənt] *n* 1. qırıntı, qırıq, parça; 2. *məc.* qalıq, tör-töküntü, qəlpə; parça, tikə, bir tikə / parça, dilim; **~s of a vase** vazanın qırıntıları; **~s of a statue** heykəlin qırıqları/parçaları; **to eat up the ~s** qalıqları yemək; 3. fraqment *(parça, hissə, qisim)*; parça, hissə; *This poem is but a fragment Bu şer ancaq bir parçadır*

**fragmentarily** ['frægməntərılı] *adv* yarımçıq, natamam, qırıq / rabitəsiz halda

**fragmentariness** ['frægməntərınıs] *n* fraqmentlik, fraqment halında olma, yarımçıqlıq, natamamlıq; qırıqlıq, rabitəsizlik

**fragmentary**['frægməntərı] *adj* fraqment *(parçalar, hissələr halında qalmış)*; natamam, qırıq, rabitəsiz; **a ~ manuscript** natamam əlyazması; ayrı-ayrı hissələrdən ibarət olan əlyazması; **a ~ conversation** rabitəsiz söhbət; **a ~ report of an event** baş vermiş hadisə haqqında natamam məlumat

**fragmentize** ['frægməntaız] *v* sındırmaq, qırmaq, doğramaq, parçalamaq, xırdalamaq, paralamaq

**fragrance** ['freıgrəns] *n* 1. ətir, rayihə, xoş iy; **the ~ of flowers/of scent** güllərin/ətrin xoş iyi; **the ~ of youth** gənclik təravəti; 2. ətir saçma qabiliyyəti

**fragrant** ['freıgrənt] *adj* 1. ətirli, rayihəli, ətirsaçan; **~ with the delicate scents of spring** yazın/baharın zərif ətri ilə dolu; **~ air** ətirli hava; 2. şirin, valehedici, heyranedici, çox gözəl; **~ memories** şirin xatirələr

**frail** [freıl] *adj* 1. kövrək, tezsınan, çox zərif/zəif/incə, davamsız, tez dağılan, qərarsız, dəyişkən; **a ~ structure** davamsız tikinti; **a ~ support** zəif/davamsız dayaq; 2. xəstə, nasaz; tez-tez xəstələnən; **a ~ child** nasaz uşaq; **a ~ old man** zəif/cansız qoca kişi; 3. keçən, keçici, fani; müvəqqəti, etibarsız; *Man's life/happiness is frail İnsan həyatı/xoşbəxtliyi müvəqqətidir*

**frailty** ['freıltı] *n* 1. kövrəklik, davamsızlıq; 2. zəiflik, xəstəlik, ağrı; 3. fanilik, müvəqqətilik, keçicilik, etibarsızlıq, davamsızlıq; 4. nöqsan, qüsur, zəiflik; mənəvi cəhətdən möhkəm olmama; *The girl loved him in spite of his little frailties Kiçik nöqsanlarına baxmayaraq qız onu sevirdi*

**frame**[1] [freım] *n* 1. karkas *(bir şeyin skeleti /əsası)*, əsas, bünövrə, gövdə, skelet; tikintinin bünövrəsi/əsası; **the ~ of a building** tikintinin karkası; **the ~ of a car** maşının gövdəsi; **the gigantic ~ of a mammoth** mamontun nəhəng skeleti;



2. bədən quruluşu, bədən; quruluş, tərtib; **a man of iron ~** güclü / qüvvətli bədən quruluşuna malik adam; **a man of huge ~** çox nəhəng bədənli adam; **a girl with / of a slender ~** çox nazik/incə qamətli qız; **a horse with a good strong ~** qədd-qamətli möhkəm at; 3. quruluş, struktur, sistem *(ictimai quruluş forması)*; **the ~ of a government** hökumətin quruluşu; **the ~ of society** cəmiyyətin quruluşu; **the ~ of a legal system** qanunvericilik sistemi; 4. xarakter, xasiyyət; tərz, üsul, təbiət; **a character of noble ~** nəcib/alicənab xasiyyət; 5. çərçivə, haşiyə; **the ~ of a window** pəncərə çərçivəsi; **the ~ of a picture** şəkil üçün çərçivə; **photograph ~** fotoqrafiya üçün çərçivə; 6. parnik *(erkən göyərti və tərəvəz yetişdirməyə məxsus bina)*; **cucumber ~** xiyar parniki; 7. toxuma dəzgahı;

◊ **~ of mind** hal, əhval, əhval-ruhiyyə, kef, ovqat

**frame**[2] [freım] *v* 1. yaratmaq, vücuda gətirmək, törətmək; qurmaq, təşkil etmək, hazırlamaq; hasil/istehsal etmək, tərtib etmək; **to ~ a theory** nəzəriyyə yaratmaq; **to ~ a plan** plan hazırlamaq/tərtib etmək; 2. tikmək, qurmaq, düzəltmək; təşkil etmək; 3. çərçivəyə salmaq, çərçivələmək; **to ~ a picture** şəkli çərçivəyə salmaq; 4. uyğunlaşdırmaq, düzəltmək, qayırmaq; **to ~ a sentence** cümlə düzəltmək; 5. inkişaf etmək, irəliləmək, tərəqqi etmək, güclənmək, artmaq, genişlənmək; *Our preparations are framing well Bizim hazırlığımız yaxşı gedir*; 6. *d.d.* düzəltmək, uydurmaq *(iş, ittiham)*, bir kəsi əsassız ittiham etmək, faktı qəsdən təhrif etmək; *The accused declared that he had been framed Müttəhim bildirdi ki, onun ittihamı uydurmadır*

**frame-house** ['freımhaus] *n* karkaslı ev

**frameless** ['freımlıs] *adj* 1. çərçivəsiz, çərçivəyə salınmamış; **a ~ picture** çərçivəsiz şəkil; 2. *tex.* ramasız; **~ vehicle** ramasız avtomobil

**frame-level** ['freım.levl] *n tex.* ramanın yüksəklik səviyyəsi

**frame-up** ['freım'ʌp] *n d.d.* 1. əsassız ittiham; faktları qəsdən təhrif etmə; saxtalaşdırma, saxtakarlıq etmə; 2. gizli razılaşma, dilbir/əlbir olma, saziş; **~ trial** süni surətdə düzəldilmiş/uydurulmuş/ qəsdən düzəldilmiş mühakimə

**framework** ['freımwə:k] *n* 1. karkas; bünövrə; skelet, gövdə; **the ~ of vertebrate animals** onurğalı heyvanların skeleti; 2. konstruksiya *(tikintinin, maşının və s.-in quruluşu)*; 3. struktur, quruluş; **the ~ of society** cəmiyyətin quruluşu; **the ~ of the novel** romanın kompozisiyası/quruluşu; 4. çərçivə, sərhəd, hədd, hüdud; **within the ~ of** *smth.* bir şeyin çərçivəsi daxilində

**frampold** ['fræmpould] *adj* 1. deyingən, daim donquldanan, daim mırtıldayan, mızı, davakar, dalaşqan, cəncəl, öcəşkən; 2. qızğın, harın *(at haq.)*

**franc** [fræŋk] *n* Frank *(Fransanın, Belçikanın, İsveçrənin pul vahidi)*

**frangent** ['frændʒənt] *adj* çata səbəb olan

**frangible** ['frændʒıbl] *adj* tezsınan, kövrək, davamsız; çox zərif / zəif / incə

**frangipane** ['frændʒıpeın] *n* 1. bot. qırmızı jasmin *(çiçək)*; 2. qırmızı jasmin iyi/ətri; 3. badamlı krem; badam kremli pirojna

**frank**[1] [fræŋk] *n* I 1. franko edilmiş/ yolxərci qabaqcadan ödənilmiş məktub; 2. yolxərci qabaqcadan ödənilmiş məktub göndərmək hüququ

**frank** [fræŋk] *n* II *zool.* vağ *(quş)*

**frank**[2] [fræŋk] *adj* (-er, -est) 1. ürəyiaçıq, səmimi, açıq; **a ~ reply** səmimi/açıq cavab; **a ~ avowal of guilt** təqsirini səmimi etiraf etmə; **to be ~ with** *smb.* bir kəslə səmimi olmaq; 2. səxavətli, əliaçıq; 3. aydın, aşkar, şübhəsiz *(əlamət, simptom haq.)*

**frank**[3] [fræŋk] *v* 1. franko etmək, xərcini qabaqcadan ödəmək *(məktubun)*; franko edilmiş/xərci qabaqcadan ödənilmiş məktub göndərmək; 2. pulsuz keçirmək *(teatra, konsertə və s.)*; 3. bir kəsi ödənişdən və s. azad etmək

**frank chase** ['fræŋktʃeız] *n hüq.* meşədə azad ov etmə hüququ

**franking** ['fræŋkıŋ] *n* franko etmə, qabaqcadan ödəmə; **~ privilege** poçtu pulsuz göndərmə imtiyazı; məktubları franko etmə hüququ, məktubların poçt xərcini qabaqcadan ödəmə hüququ

**frankly** ['fræŋklı] *adv* açıq, açıqcasına, səmimiyyətlə; **to answer ~** səmimiyyətlə cavab vermək; *Frankly, I don't like him Açıq desək, o mənim xoşuma gəlmir*

**frankness** ['fræŋknıs] *n* doğruluq, düzlük, açıqlıq, saflıq, açıqürəklilik, səmimilik, səmimiyyət

**frantic** ['fræntık] *adj* 1. qəzəbli, qeyzli, hiddətli, dəli, divanə, ağılsız, düşüncəsiz; **to be ~ with grief / with pain / with rage** dərddən/ağrıdan/qəzəbdən ağlını itirmək, dəli olmaq; **~ appeal for help** kömək üçün acizanə yalvarma/yalvarış; **to drive** *smb.* **~ by worrying him with endless questions** hədsiz suallarla bir kəsi dəli/ divanə etmək; 2. dəhşətli, vahiməli, müdhiş; çox güclü/şiddətli; **~ muddle** biabırçı səliqəsizlik; **a ~ toothache** dəhşətli diş ağrısı; **in a ~ hurry** dəhşətli tələsikliklə

**frantically** ['fræntıklı] *adv* qəzəblə, qeyzlə, hiddətlə, acıqla, dəli kimi, quduzcasına, azğıncasına, dəlicəsinə

**frappe** [fræ'peı] *adj fr.* soyudulmuş, soyuq, dondurulmuş; donmuş, bərk soyudulmuş; buzlu; **wine ~** soyudulmuş şərab

**fraternal** [frə'tə:nl] *adj* qardaş, qardaşlıq; **~ affection** qardaş məhəbbəti; **~ order / soci-**

**ety/association** ittifaq, cəmiyyət *(əksər hallarda gizli)*

**fraternity** [frə'tə:nıtı] *n* 1. qardaşlıq, dostluq, yoldaşlıq, qan qohumları/qohumluğu; **the ~ of all men** bütün insanların qardaşlığı; 2. icma, cəmiyyət, təşkilat; **to be a member of a ~** cəmiyyətin/təşkilatın üzvü olmaq; 3. *amer.* tələbə cəmiyyəti, həmyerlilər birliyi / cəmiyyəti; 4. birlik; kampaniya, həmkarlar, məsləkdaşlar; **the legal ~** hüquqşünaslar kampaniyası; **the angling ~** balıqçılar/ balıqtutanlar birliyi; **the ~ of the Press** jurnalistlər birliyi

**fraternization** [,frætənaı'zeıʃn] *n* 1. yaxın dostluq; 2. işğal edilmiş ərazinin qadını / qızı ilə əlaqə; 3. qardaşlaşma

**fraternize** ['frætənaız] *v* 1. qardaşlıq münasibətində olmaq; 2. işğal edilmiş ölkənin əhalisi ilə ünsiyyət saxlamaq; işğal edilmiş ölkənin qadınları ilə əlaqəyə girmək; 3. qardaşlaşmaq, dost olmaq, qardaşlıq ittifaqı yaratmaq

**fratricidal** [,freıtrı'saıdl] *adj* qardaş xalqların qırğınına səbəb olan; **~ war** qardaş qırğını

**fratricide** ['freıtrısaıd] *n* 1. qardaş qatili; 2. bacı qətli; bacı qatili

**fratry** ['freıtrı] *n* 1. qardaşlıq, dostluq, yoldaşlıq; 2. kişi monastrı

**fraud** [frɔ:d] *n* 1. *hüq.* aldatma, aldanma, fırıldaq, hiyləgərlik, adam aldatma, dələduzluq; **~ in fact** qəsdən/qərəzlə/qabaqcadan düşünülmüş fırıldaq/hiyləgərlik; **to get money by ~** hiylə ilə / aldadaraq pul almaq; 2. *d.d.* saxta; qəlp, süni; *Much advertised nostrums are often frauds Geniş reklam edilmiş patentli dərmanların əksəri tam fırıldaqdır;* 3. yalançı, adamaldadan, fırıldaqçı, hiyləgər, dələduz *(adam)*; **a pure ~** əsl/xalis fırıldaqçı

**fraudful** ['frɔ:dful] *adj* fırıldaqçı, hiyləgər, fırıldaq, yalan, yalançı, saxta

**fraudulent** ['frɔ:djulənt] *adj* yalan, yalançı, saxta, fırıldaqçı, hiyləgər, dələduz; **a ~ trustee** fırıldaqçı qəyyum / hami; *There is something fraudulent about it Orada nə isə bir hiylə var*

**fraudulently** ['frɔ:djuləntlı] *adv* hiylə ilə, dələduzluqla, fırıldaqçılıqla; **to act ~** dələduzluqla hərəkət etmək

**Fraulein** ['frɔ:laın] *n alm.* 1. mürəbbiyə *(burjua və zadəgan ailələrdə uşaqlara ilk tərbiyə və təhsil vermək üçün saxlanılan tərbiyəçi alman qadını/qızı)*; 2. alman dili müəllimi *(İngiltərədə)*; 3. xanım *(bəzi qərb ölkələrində ərsiz qadına müraciət forması)*

**fray**[1] [freı] *n* 1. toqquşma, vuruşma, savaşma, dalaşma, dava; **ready/eager for the ~** vuruşmağa girməyə hazır; **to join / to enter the ~** davaya/savaşa/qalmaqala girmək; 2. qorxu, vahimə, dəhşət

**fray**[2] [freı] *v* I 1. toqquşma yaratmaq, dava salmaq; 2. qorxutmaq, hədələmək; hürkütmək

**fray** [freı] *v* II 1. sürtüb yırtmaq/dağıtmaq /deşmək, köhnəltmək, geyib köhnəltmək /dağıtmaq/yırtmaq; 2. sürtülüb yırtılmaq /dağılmaq /deşilmək; sürtülmək, köhnəlmək, dağılmaq, yırtılmaq *(paltar, ayaqqabı haq.)*; *The cloth frays badly Bu parça tez yırtılır, Bu parça çox davamsızdır;* 3. pərt etmək, ovqatını təlx etmək, kefini pozmaq, qanını qaraltmaq, acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək

**frayed** [freıd] *adj* dağılmış, köhnəlmiş, geyilmiş, nimdaş; **~ collar** sürtülmüş/sapı çıxmış yaxalıq; **~ cuffs** köhnə/yırtıq manjet *(paltar qolunun qatlanmış hissəsi)*

**frazzle**[1] ['fræzl] *n amer. d.d.* 1. köhnəlmə, yırtılma, dağılma *(işlənməkdən)*; 2. *pl* cındır paltar; cır-cındır, əsgi-üsgü;

◊ *I'm done to a frazzle Mən çox yorğunam/əldən düşmüşəm;* **to work oneself to a ~** işləyib özünü taqətdən salmaq

**frazzle**[2] ['fræzl] *v amer.* 1. sürtüb yırtmaq / dağıtmaq/deşmək, geyib köhnəltmək/dağıtmaq /yırtmaq; cır-cındır halına salmaq, əsgi-üsgü halına salmaq; 2. sürtülüb yırtılmaq/dağılmaq/ deşilmək; sürtülmək, köhnəlmək, dağılmaq, yırtılmaq *(paltar, ayaqqabı haq.)*; 3. incitmək, əzab/əziyyət vermək, əldən salmaq, işgəncə vermək

**freak**[1] [fri:k] *n* 1. şıltaqlıq, qəribəlik, ədabazlıq; əcaiblik, tərslik; **out of mere ~** sadəcə olaraq şıltaqlıqdan; 2. eybəcərlik, kifirlik, çirkinlik, bədheybətlik, idbarlıq

**freak**[2] [fri:k] *v* şıltaqlıq/naz etmək; hoqqa çıxartmaq; sarsaqlamaq, səfehləmək; gic-gic zarafat etmək

**freakish** ['fri:kıʃ] *adj* 1. şıltaqçı, şıltaq, nazlı, tələbkar; **~ child** şıltaq uşaq; **~ climate** şıltaq iqlim/ab-hava; 2. qəribə, qeyri-adi, anlaşılmaz; əcaib; **~ behaviour** əcaib/ qəribə davranış

**freckle**[1] ['frekl] *n* 1. çil *(dəridə, üzdə)*; 2. meyvənin nazik qabığı

**freckle**[2] ['frekl] *v* çillə/ləkə ilə örtmək; *The sun freckles one's face and neck Gunəşdən adamın üzü və boynu çillənir*

**freckled** ['frekld] *adj* 1. çil, çil-çil, çillə örtülmüş; **~ face** çil-çil üz; **~ nose** çilli burun; 2. ləkələrlə örtülmüş

**free**[1] [fri:] *adj* 1. azad, müstəqil, sərbəst; **a ~ country** azad ölkə; **~ people** azad xalq; **to set/to make ~** azad etmək; **a ~ translation** sərbəst tərcümə; **~ love** azad məhəbbət; **~ pass** azad giriş; *Admission is free on Monday Bazar ertəsi giriş azaddır;* **to set a bird ~** quşu azad etmək *(qəfəsdən)*; **to get ~** azad olmaq; 2. sərbəst, könüllü; **~ choice** sərbəst seçmə; 3. boş, bikar; *Are you free in the afternoon? Sən /Siz axşamüstü boşsan?/boşsunuz?; Have you any*



*rooms free? Boş otaqların/otaqlarınız varmı?;* **to have little ~ time** az boş vaxtı olmaq; *The way is free Yol boşdur;* **to make the road ~** yolu boşaltmaq; **~ access** açıq/sərbəst giriş; **to make ~ use of *smth.*** bir şeydən azad istifadə etmək; 4. *iqt.* azad; **~ zone** azad zona *(gömrüksüz idxal)*; **~ port** azad liman; 5. pulsuz, havayı, müftə; **~ of charge** pulsuz; **~ board and lodging** pulsuz yemə/qidalanma və mənzil; **~ education** pulsuz təhsil; **~ medical attention** pulsuz tibbi yardım; **~ treatment** pulsuz müalicə; *Tickets are given free Biletlər pulsuz verilir;* 6. ödənilməyən, xərclərdən azad; **~ of duty** gömrüksüz; **~ imports** gömrüksüz mallar; **~ of income tax** gəlir vergisi qoyulmayan/alınmayan; 7. **(of, from)** bir şeydən azad / məhrum edilmiş; **a river ~ of ice** buzlardan təmizlənmiş çay; **a day ~ from wind** küləksiz gün; **~ from pain** ağrısız; **to be ~ of disease** xəstəlikdən xilas olmaq; **to be ~ from duty** növbətçilikdən azad olmaq; **~ of debt** borcdan azad; **~ from cares** qayğısız, qayğıdan azad; 8. bərkidilməmiş, sərbəst; **to leave one end of a rope ~** kəndirin bir ucunu bağlamamaq/boş buraxmaq; 9. səxavətli, əliaçıq, bol, çox, dolu, çoxlu, zəngin; **to be ~ with *one's* money** pulunu sərbəst sərf etmək, israfçıl/bədxərc olmaq; **~ spender** israfçı, bədxərc; *He seems rather free with his insults İnsanı təhqir etmək onun üçün heç bir şey deyil;* 10. yüngül, lətif, zərif, vüqarlı; **~ gesture** zərif/incə jest; **~ step** yüngül addım/yeriş; 11. sərbəst, azad; bitərəf; **~ position** bitərəf mövqe; **~ flight** azad/sərbəst uçuş; 12. boş, boş-boşuna, səmərəsiz, faydasız; **~ running** *tex.* boş-boşuna işləmə;

◊ **~ speech** söz azadlığı; **~ labour** həmkarlar ittifaqının üzvü olmayan fəhlələr; **~ pardon** bağışlama, günahından keçmə, əfv etmə; **~ of** ... xaricində; *The ship is not free of the harbour yet Gəmi hələ limandan çıxmayıb;* **for ~** müftə, pulsuz, havayı; özgə hesabına; **to have / to give a ~ hand** sərbəst hərəkət etmək hüququ olmaq / vermək; **to spend with a ~ hand** pulu sağasola sovurmaq; **to have *one's* hands ~** boş / bikar olmaq, sərbəst hərəkət etmək hüququna malik olmaq

**free**[2] [fri:] *v (pt, pp* **freed** [fri:d]) azad / xilas etmək; **to ~ the land from oppression** ölkəni zülmdən azad/xilas etmək; **to ~ *smb.* from captivity** bir kəsi əsirlikdən azad etmək; **to ~ *smb.* from restraint** bir kəsi həbsdən azad etmək; **to ~ *one's* hands from fetters** əllərini qandaldan azad etmək; **to ~ *smb.* from debt** bir kəsi borcdan azad etmək; **to ~ *one's* mind from anxiety** sakitləşmək, sakit/rahat olmaq, həyəcandan xilas olmaq

**free**[3] [fri:] *adv* 1. pulsuz, müftə, havayı; *All members admitted free Giriş cəmiyyətin bütün üzvləri üçün pulsuzdur;* 2. = **freely**

**free-and-easy** ['fri:ənd'i:zı] *adj* 1. sərbəst, təbii, sadə; təklifsiz; **~ manners** təbii/sadə davranışlar; 2. hörmət gözləməyən, ədəbsiz, nəzakətsiz, utanmaz, saymaz; **~ judgements** sərbəst fikirlər/mülahizələr/ mühakimələr; *He was free-and-easy with his friend's money O, dostunun pulundan öz pulu kimi istifadə edirdi*

**freedman** ['fri:dmæn] *n (pl* **-men** [-mən]) 1. azad edilmiş qul / təhkimli kəndli; 2. *amer.* azadlıq almış qul / kölə *(vətəndaş müharibəsi nəticəsində)*

**freedom** ['fri:dəm] *n* 1. azadlıq, müstəqillik, istiqlaliyyət; **the ~ of a country** ölkənin müstəqilliyi; **to enjoy ~** azadlıqdan istifadə etmək, azad / müstəqil olmaq; **to speak with ~** cəsarətlə danışmaq, fikrini sərbəst ifadə etmək; **to fight for ~** azadlıq uğrunda mübarizə aparmaq; 2. **(from)** azadlıq, azad olma *(bir şeydən)*; **~ from fear/care/want/taxes** qorxudan/qayğıdan /ehtiyacdan/vergidən azad olma; **~ from a defect** eyibsizlik, nöqsansızlıq, qüsursuzluq, ləkəsizlik, təmizlik; **~ from a disease** sağlamlıq, cansağlığı; **~ from a burden** yüngüllük, sakitlik, asanlıq; 3. azadlıq; **~ and necessity** *fəls.* azadlıq və zərurət; **~ of speech/of press/of conscience** söz/mətbuat / vicdan azadlığı; **~ of the will** iradə sərbəstliyi; *You have perfect freedom to do as you like Sənin / Sizin ağlına / ağlınıza gələni etməyə tam ixtiyarın/ixtiyarınız var;* 4. sərbəst istifadə etmə; **to have the ~ of a house/ of a library** evdən/kitabxanadan sərbəst istifadə etmək; 5. doğruluq, düzgünlük, açıqürəklilik, səmimilik; 6. *d.d.* sərbəstlik, azadlıq; **to take / to use ~s with *smb.*** bir kəslə sərbəst davranmağı özünə rəva bilmək; **to take undue ~s with *smth.*** bir şeyi sərbəst işlətmək; 7. hərəkətlilik, mütəhərriklik; **degree of ~** *xüs.* azadlığın dərəcəsi; 8. *tex.* ara, aralıq

**free enterprise** ['fri:'entəpraız] *n* azad sahibkarlıq; sərbəst təşəbbüskarlıq

**free-for-all** ['fri:fə'ɔ:l] *n amer.* 1. hər kəsin iştirak edə biləcəyi yarışlar/diskussiyalar; 2. *d.d.* ümumi savaşma/dalaşma/vuruşma/ dava-dalaş; qarışıqlıq, vurhavur

**free-gift** ['fri:gıft] *n* xeyriyyə lotereyasında uduş

**free-hand**[1] ['fri:hænd] *n* 1. əllə çəkilən şəkil; 2. hərəkət azadlığı

**free-hand**[2] ['fri:hænd] *adj* əllə edilmiş *(şəkil haq.)*

**free-handed** ['fri:'hændıd] *adj* səxavətli, comərd, əliaçıq; **~ help** səxavətli kömək

**free-hearted** ['fri:'ha:tıd] *adj* 1. safqəlbli, təmizürəkli, açıqürəkli, səmimi, ürəyiaçıq; ~

mirth sərbəst şənlik/şadlıq/ əyləncə; 2. səxavətli, əliaçıq
**free-heartedly** ['fri:'ha:tıdlı] *adv* 1. səmimi olaraq, açıq ürəklə, açıqdan-açığa, açıqcasına, heç bir şeyi gizlətmədən; 2. bolluca, çoxlu
**freeholder** ['fri:.houldə'] *n* azad torpaq sahibi, azad mülkədar
**free lance** ['fri:la:ns] *n* 1. müəyyən partiyaya mənsub olmayan siyasətçi/siyasi xadim/siyasət adamı; 2. *d.d.* ştatda olmayan, ştatdankənar jurnalist/fotoqraf; 3. azad rəssam
**free list** ['fri:lıst] *n* 1. bir yana pulsuz keçmə / daxil olma hüququna malik olan şəxslərin siyahısı; 2. *iqt.* vergi qoyulmayan / alınmayan malların siyahısı
**free-liver** ['fri:.lıvə'] *n* kefcil, kef/zövq əhli, əhli-kef
**free-living** ['fri:'lıvıŋ] *adj* öz kefi üçün yaşayan, kef edən, həyatını keflə keçirən, qəmsiz həyat sürən
**freely** ['fri:lı] *adv* 1. azad, sərbəst, azad / sərbəst surətdə; **to speak** *one's* **mind** ~ fikrini azad surətdə bildirmək/demək; **to breathe more** ~ daha azad nəfəs almaq; 2. bolluca, çoxlu, çoxluca, bol-bol; geniş surətdə; **to help** ~ bolluca kömək etmək; 3. açıqcasına, açıq-açığına, açıq, səmimiyyətlə; **to admit** *smth.* ~ bir şeyi açıq /açıqcasına etiraf etmək
**freeman** ['fri:mən] *n* (*pl* **-men** [-mən]) 1. azad / müstəqil/bərabər hüquqlu vətəndaş; 2. hər hansı cəmiyyətin / korporasiyanın tamhüquqlu üzvü; 3. şəhərin fəxri vətəndaşı
**free-minded** ['fri:'maındıd] *adj* qayğısız, qəmsiz, dərdsiz, fikirsiz, laqeyd, başısoyuq
**free-spoken** ['fri:'spoukn] *adj* səmimi, açıq (*mülahizələrində, fikirlərində*); ~ **man** fikirləşdiyini deyən adam
**free-style** ['fri:staıl] *n id.* sərbəst üsulla üzmə
**free-styler** ['fri:staılə'] *n id.* sərbəst üsulla üzən üzgüçü
**free-thinker** ['fri:'θıŋkə'] *n* azadfikirli, ateist, azad düşünən adam
**free-thinking**[1] ['fri:'θıŋkıŋ] *n* azadfikirlilik, ateizm, allahsızlıq
**free-thinking**[2] ['fri:'θıŋkıŋ] *adj* azadfikirli, ateist
**freetrade** ['fri:'treıd] *n* 1. gömrüksüz ticarət; 2. *arx.* kontrabanda (*qaçaq mal gətirmə, qaçaqçılıq; qaçaq mal*); 3. *iqt.* sərbəst ticarət
**free-trader** ['fri:'treıdə'] *n* 1. sərbəst ticarət tərəfdarı; 2. *arx.* kontrabandçı
**freewill** ['fri:'wıl] *n* 1. iradə sərbəstliyi; **of** *one's* **own** ~ könüllü, öz arzusu / xahişi / xoşu ilə; 2. *fəls.* insan iradəsinin mütləq sərbəstliyi
**freeze**[1] [fri:z] *n* 1. dondurma; soyuq, şaxta; 2. bir səviyyədə saxlama; **temporary** ~ **of prices** qiymətlərin müvəqqəti dondurulması/bir səviyyədə saxlanılması
**freeze**[2] [fri:z] *v* (*pt* **froze** [frouz]; *pp* **frozen** ['frouzn]) 1. donmaq, buza çevrilmək; buzla örtülmək; *The lake has frozen hard Göl bərk buz bağlayıb; The water-pipe froze Su kəməri dondu;* 2. dondurmaq; **to ~ wages** əmək haqqını dondurmaq; **to ~ prices** qiymətləri dondurmaq; **to ~ meat to preserve it** xarab olmamaq üçün əti dondurmaq; *The intense cold froze the water pipes Bərk şaxtadan su kəmərləri dondu; The road is frozen hard Şaxtadan yol bərk donub;* 3. şaxta vurmaq; *The cold froze the orange trees Portağal ağaclarını şaxta vurdu; It is freezing hard Bərk şaxtadır; The bird's feathers froze together Quşun lələkləri / tükləri donub bir-birinə yapışdı; His hands froze to the oars Onun əlləri şaxtadan kürəklərə/avarlara yapışdı;* 4. bərk üşümək, donmaq; *I am freezing Mən donuram;* 5. bərkimək; *The alloy freezes quickly Ərinti tez bərkiyir*
**freezer** ['fri:zə'] *n* 1. buxarlandırıcı, buğlandırıcı (*maye buxarlandıran cihaz*); 2. soyuducu, dondurucu kamera; 3. vaqon-refrijerator (*buzxanalı vaqon*); 4. dondurma qabı
**freeze-up** ['fri:z'ʌp] *n amer.* donma (*çay/ göl haq.*)
**freezing**[1] ['fri:zıŋ] *n* 1. donma; dondurma, dondurulma; 2. soyuma, donma; bərkimə; 3. dondurma (*əmək haqqını və s.*); 4. bərk soyuq, şaxta; *It's freezing outside Bayırda/Çöldə bərk soyuqdur/şaxtadır*
**freezing**[2] ['fri:zıŋ] *adj* 1. dondurucu; soyuducu; **a ~ machine** dondurma qabı; 2. buz, buzlu, soyuq; **a ~ wind** soyuq külək; **to give a ~ glance** bir kəsə soyuq baxmaq
**freezingly** [fri:zıŋlı] *adv* soyuq; soyuqcasına, soyuq bir tərzdə
**freezing-point** ['fri:zıŋpɔınt] *n fiz.* donma nöqtəsi
**freezing-test** ['fri:zıŋtest] *n xüs.* şaxtaya davamlılığı yoxlama / sınaqdan keçirmə
**freight**[1] [freıt] *n* 1. yükdaşıma; *What will be the charges for freight and delivery? Yükdaşıma və çatdırmanın qiyməti nə qədər olacaq?;* 2. daşıma qiyməti; 3. yük, ağır yük, ağırlıq
**freight**[2] [freıt] *adj* yük; ~ **carrier** yük gəmisi; ~ **elevator** yük qaldırıcı mexanizm (*kran/lift*); ~ **car** *amer.* yük vaqonu; ~ **rates** yük tarifləri
**freight**[3] [freıt] *v* 1. yükləmək, yük vurmaq; **to ~ a car** *amer.* vaqona yük vurmaq; 2. kirayə etmək, kirayəyə götürmək; **to ~ a ship** gəmini kirayəyə götürmək
**French**[1] [frentʃ] *n* 1. fransız dili; **to speak ~** fransız dilində danışmaq; **to learn ~** fransız dilini öyrənmək; 2. **(the ~)** fransızlar, fransız xalqı; **customs of the ~** fransızların adətləri
**French**[2] [frentʃ] *adj* fransız; **a ~ lesson** fransız dili dərsi; **a ~ master** fransız dili müəllimi; **~ art** fransız incəsənəti; **~ politeness** fransız nəzakəti



**French-beam** ['frentʃ'bi:m] *n bot.* adi maş, paxla, lobya
**French bread** ['frentʃ'bred] *n* uzun baton (*uzunsov ağ çörək*)
**French Canadian** ['frentʃkə'neıdjən] *n* 1. fransız dilində danışan kanadalı; fransız mənşəli kanadalı; Kanada fransızı; 2. fransız dilinin Kanada variantı
**French cuff** ['frentʃ'kʌf] *n* qatlama manjet (*paltar qolunun qatlanmış hissəsi*)
**French door** ['frentʃ'dɔ:'] *n* şüşə salınmış/ şüşələnmiş laylı qapı
**French horn** ['frentʃ'hɔ:n] *n* valtorna (*nəfəslə çalınan halqavarı musiqi aləti*)
**Frenchify** ['frentʃıfaı] *v d.d.* fransızlaşdırmaq
**French-like** ['frentʃlaık] *adj* fransız kimi, fransıza oxşar / bənzər
**Frenchman** ['frentʃmən] *n* (*pl* **-men** [-mən]) 1. fransız; 2. fransız gəmisi
**French nail** ['frentʃ'neıl] *n* məftil mıx, mismar
**French window** ['frentʃ'wındou] *n* 1. balkon qapısı; 2. ikitaylı / ikilaylı pəncərə (*döşəməyə qədər çatan*)
**Frenchwoman** ['frentʃ.wumən] *n* (*pl* **-women** [-wımın] fransız qadın
**frenzied** ['frenzıd] *adj* qudurmuş, quduz, azğın, qızğın, hirsli, qudurğan, hirslənmiş, özündən çıxmış; **a ~ attack** dəlicəsinə/amansız hücum; **~ efforts** qızğın səylər; **~ rage** azğın qəzəb; **~ dreams** qızğın arzular
**frenziedly** ['frenzıdlı] *adv* dəli kimi, quduzcasına, qeyzlə, hiddətlə, hirslə, dəlicəsinə; qəzəblə, qeyzlə, qəzəblə, amansızcasına, azğın
**frenzy**[1] ['frenzı] *n* 1. dəlilik, quduzluq, hiddət, azğınlıq; qəzəb, qeyz, qudurğanlıq; **a fit of ~** dəlilik tutması; **to drive** *smb.* **to ~** bir kəsi qəzəbləndirmək/özündən çıxartmaq; **to work oneself into a ~** quduzlaşmaq, hiddətlənmək; 2. son dərəcə böyük həvəs/maraq; **a ~ for travelling** səyahətə son dərəcə böyük həvəs/ maraq
**frenzy**[2] ['frenzı] *v* quduzluğa səbəb olmaq; dəlilik həddinə çatdırmaq
**frequence** ['fri:kwəns] *n* = **frequency**
**frequency** ['fri:kwənsı] *n* 1. tezlik; **~ of the pulse** nəbzin tezliyi; **~ of milking** *k.t.* sağma/sağılma tezliyi; 2. tez-tez təkrar etmə; təkrarlıq; *This happens with extreme frequency Bu olduqca tez-tez təkrar olunur;* 3. *fiz.* tezlik; **high/low ~** yüksək/ aşağı tezlik; **audio ~** səs tezliyi; **carrier ~** aparıcı dalğa tezliyi
**frequent**[1] ['fri:kwənt] *adj* 1. tez-tez, sıx, sıx-sıx, bir-birinə yaxın; **~ pulse** tez-tez vuran nəbz; *His breathing is much too frequent O, olduqca tez-tez nəfəs alır; There is a very frequent service of trains Burada qatarlar çox tez-tez işləyir;* 2. tez-tez rast gəlinən/təsadüf edilən; adi, həmişəki; *Fossils are very frequent in limestone Əhəngdaşlarında çox tez-tez daşlaşmaya təsadüf edilir;* **~ sight/spectacle** adi mənzərə; **~ disease** çox yayılmış xəstəlik; 3. tez-tez təkrar olunan; **~ visits** tez-tez təkrar olan vizitlər / görüşlər; **~ pains** tez-tez təkrar olan ağrılar; 4. arası kəsilməyən, arasıkəsilməz, həmişə, tez-tez; **~ visitor** həmişə gələn adam; **~ theatre-goer** teatr həvəskarı, teatra tez-tez gedən adam
**frequent**[2] [frı'kwent] *v* 1. tez-tez getmək/ baş çəkmək / yoluxmaq; **to ~ a house** bir evdə tez-tez olmaq, bir evə tez-tez baş çəkmək; **to ~ concerts** konsertə tez-tez getmək; *Tourists frequent this castle Turistlər bu qalaya tez-tez gəlirlər; Ships frequent this port Gəmilər tez-tez bu limana girirlər;* 2. həmişə / daim olmaq (*bir kəslə*); **to ~** *smb.'s* **company** tez-tez bir kəslə görüşmək/olmaq; *I know him but I don't frequent him much Mən onu tanıyıram, lakin onunla tez-tez görüşmürəm/olmuram*
**frequentation** [.fri:kwən'teıʃn] *n* 1. tez-tez gəlmə / baş çəkmə / yoluxma; 2. *arx.* tez-tez işlənmə
**frequenter** [frı'kwentə'] *n* tez-tez / həmişə gələn/baş çəkən adam, bir yerə həmişə/ daim gələn adam
**frequently** ['fri:kwəntlı] *adv* tez-tez, həmişə, daim; **to remind** *smb.* **of** *smth.* ~ bir şeyi tez-tez bir kəsin yadına salmaq / bir kəsə xatırlatmaq
**fresh**[1] [freʃ] *adj* 1. təzə, tər, təravətli; **the ~ shoots of a plant** bitkinin təzə zoğları/ pöhrələri; **~ flowers** təzə/tər güllər; **~ tea** təzə dəmlənmiş çay; **~ paint** təzə boya/ rəng (*qurumamış*); *Fresh paint! Ehtiyatlı olun, təzə rənglənib!* 2. təbii; təzə; konservləşdirilməmiş; **~ butter** təzə yağ; **to eat** *smth.* ~ bir şeyi təzə ikən yemək; 3. xarab olmamış, təzə; **~ eggs** təzə yumurtalar; **~ meat** təzə ət; *Take a fresh sheet of paper Təzə bir vərəq kağız götür/götürün;* 4. yeni, əlavə, daha bir; **~ supply** əlavə ehtiyat; **to begin a ~ chapter** yeni fəsli başlamaq; **to make a ~ start** hər şeyə yenidən başlamaq; 5. orijinal, gözlənilməyən, gözlənilməz; **~ idea** orijinal fikir; *His remarks are always fresh Onun fikirləri həmişə orijinaldır;* 6. təzə, tanış/ məlum olmayan; *No fresh news Təzə xəbər yoxdur;* **to meet ~ faces** yeni üzlərə rast gəlmək; 7. *d.d.* yenicə/təzəcə gəlmiş; **~ from school** məktəbi yenicə bitirmiş; **~ from the war** müharibədən yenicə /təzəcə qayıtmış; 8. sağlam, gümrah; **~ complexion** sağlam / gümrah sifət; 9. təmiz (*hava haq.*); **~ air** təmiz hava; 10. təmiz, geyilib çirkləndirilməmiş; **~ shirt/collar** təmiz köynək/ yaxalıq; 11. gümrah, möhkəm, qıvraq; *In the morning he was fresh and gay Səhər o, gümrah və şən idi;* 12. təcrübəsiz, təlim görməmiş / keçməmiş; ~

**hand** təcrübəsiz adam/fəhlə; təzə şagird; **13.** sərin, sərinlədən *(hava və s. haq.)*; ~ **breeze** sərin külək; **14.** şirin *(su haq.)*; ~ **water** şirin su

**fresh²** [freʃ] *v* **1.** təzələmək, sərinlətmək, havasını təzələmək; **2.** sərinləşmək, soyuqlaşmaq; **3.** təravətlənmək, qızarmaq *(sifət)*

**fresh-blown** [ˈfreʃˈbloun] *adj* təzəcə çiçək açmış

**fresh-coloured** [ˈfreʃˈkʌləd] *adj* parlaq, sağlam, təravətli *(üzün rəngi haq.)*

**fresh cow** [ˈfreʃˈkau] *adj k.t.* **1.** təzə doğmuş inək; **2.** birinci/ilk dəfə doğan inək

**freshen** [freʃn] *v* **1.** təzələmək, sərinlətmək, havanı təzələmək/dəyişmək; **2.** *məc.* canlandırmaq, sağlamlaşdırmaq, təravətləndirmək *(həm də* **to ~ up)**; **to ~ up one's memory** hafizəsində canlandırmaq; **to ~ up smb.'s memory** bir kəsin yadına salmaq, bir kəsə xatırlatmaq *(nəyisə)*; *She went to her room to freshen (up) after the long journey Uzun səyahətdən sonra özünü qaydaya salmaq üçün o, otağına getdi;* **3.** canlanmaq; *Flowers freshen after rain Güllər yağışdan sonra canlanır;* **4.** güclənmək, bərkimək, şiddətlənmək *(külək haq. həm də* **to ~ up)**; *The wind is freshening Külək güclənir;* **5.** şirinləşdirmək, şirinlətmək, duzdan təmizləmək, içməli hala salmaq *(suyu)*; **6.** *amer. k.t.* buzovlamaq, doğmaq, balalamaq; sağmal/südverən olmaq *(inək haq.)*;

◊ **to ~ way** sürəti artırmaq

**freshening** [ˈfreʃnıŋ] *n* **1.** təravətləndirmə, təzələmə, təmizləmə, dəyişdirmə, canlandırma; **2.** sərinlətmə, havasını dəyişmə/təzələmə; **3.** şirinləşdirmə, duzdan təmizləmə; **4.** *k.t.* cütləşdirmə, cütləşmə *(heyvanları)*; **5.** *amer.* balalama, buzovlama, doğum *(inəklərdə)*

**fresher** [ˈfreʃəʳ] *n* **1.** birinci kurs tələbəsi; **2.** *d.d.* sərin külək

**freshet** [ˈfreʃıt] *n* **1.** dənizə tökülən şirin su axını; **2.** sel, daşqın; güclü sel, çayın daşması *(yağış yaxud bərk qar yağması nəticəsində)*; **3.** *şair.* şirin suyu olan kiçik çay

**fresh-keeping** [ˈfreʃˌki:pıŋ] *n* təzə vəziyyətdə saxlama *(tərəvəzi, meyvələri)*

**freshly** [ˈfreʃlı] *adv* **1.** təzə, sağlam; **2.** qıvraq, gümrah; **3.** yenidən, təzədən; **4.** bir az bundan qabaq, bu günlərdə/yaxınlarda; ~ **coined penny** təzə zərb olunmuş sikkə; ~ **washed** təzəcə yuyulmuş

**freshman** [ˈfreʃmən] *n (pl* **-men** [-mən]) *d.d.* **1.** təzə şagird; **2.** *amer.* birinci kurs tələbəsi; **3.** vəzifədə birinci il olan şəxs; *He is a freshman in Congress O, konqresdə birinci il iştirak edir;* ~ **year** təşkilatda birinci il olma; ~ **class** *amer.* ali məktəbdə aşağı kurs

**freshness** [ˈfreʃnıs] *n* **1.** təzəlik, yenilik, təravətlilik, sərinlik; **the ~ of the air** havanın sərinliyi; **2.** gümrahlıq, qıvraqlıq; **3.** parlaqlıq, aydınlıq, açıqlıq; **the ~ of colour** rənglərin parlaqlığı; **4.** təzəlik, yenilik, orijinallıq; ~ **of an idea** fikrin orijinallığı

**freshwater** [ˈfreʃˌwɔ:təʳ] *adj* şirin suda yaşayan; ~ **fish** şirin suda yaşayan balıq;

◊ ~ **sailor** təcrübəsiz/bacarıqsız dənizçi; ~ **college** *amer.* balaca əyalət kolleci

**fret¹** [fret] *n* **1.** acıqlanma, əsəbiləşmə, qıcıqlanma, acıq, hirs; həyəcan, vəlvələ, çaxnaşma, təşviş, iztirab, narahatlıq; **to get/to work oneself into a ~** həyəcanlanmaq; **to be in a fearful state of ~** son dərəcə həyəcanlı vəziyyətdə olmaq; **to be on the ~** acıqlı/hirsli vəziyyətdə olmaq; **2.** qıcqırma, turşuma, acıma *(içkilər haq)*; **3.** spazma *(qıc olma, sıxılma, tutulma)*, sancı; **4.** *tex.* sürtünmə, sürtülüb yeyilmə

**fret²** [fret] *v* **1.** acıqlanmaq, hirslənmək, əsəbiləşmək, narahat/nigaran olmaq, təşvişə düşmək, iztirab çəkmək; **to ~ over smth.** bir şey haqqında narahat olmaq; *You have nothing to fret about Sənin/ Sizin narahat olmağa əsasın/əsasınız yoxdur;* **2.** acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək, həyəcana / təşvişə salmaq, narahat etmək; *It frets me to know that he is unhappy Onun bədbəxt olması məni narahat edir;* **to ~ one's life out with vain regrets** əsassız peşmançılıqla öz həyatını korlamaq; **to ~ the heart by care and anxiety** dərd və qayğılarla ürəyi üzmək, iztirab vermək; **to ~ oneself to death** həyəcanla/iztirabla özünü üzmək; **3.** yemək, korlamaq, xarab etmək *(pas, turşu və s. haq.)*, zədələmək; *Rust frets metals Pas metalları yeyir; Moths fret away clothes Güvə paltarı yeyir*

**fretful** [ˈfretfl] *adj* **1.** tez acıqlanan/hirslənən, əsəbi, şıltaqçı, şıltaq; **a ~ child** şıltaq uşaq; **2.** coşğun, kəskin, sərt, şiddətli *(külək haq.)*; **3.** qıcqıran, turşuyan, acıyan *(içkilər haq.)*

**fretted** [fretıd] *adj* **1.** acıqlı, hirsli, həyəcanlı, əsəbi, təşvişə/təlaşa salınmış; **2.** köhnəlmiş, dağılmış, yırtılmış *(çox işlənməkdən)*, köhnə, sürtülüb üzülmüş/yırtılmış *(paltar haq.)*; yeyilmiş *(güvə tərəfindən)*

**friability** [ˌfraıəˈbılıtı] *n* **1.** yumşaqlıq; tez sınma, kövrəklik, davamsızlıq; **2.** *məc.* zəriflik, zəiflik, incəlik

**friable** [ˈfraıəbl] *adj* **1.** ovulub tökülən; tezsınan, kövrək, davamsız; **2.** *məc.* çox zərif/zəif/incə; **3.** yumşaq; boş; ~ **coal** yumşaq kömür

**friary** [ˈfraıərı] *n* kişi monastrı

**fribble¹** [ˈfrıbl] *n* **1.** veyl, avara, tənbəl *(adam)*; **2.** boş / əhəmiyyətsiz / cüzi şey; **3.** yüngüllük, ədəbsizlik; ədəbsiz söz

**fribble²** [ˈfrıbl] *adj* **1.** əhəmiyyətsiz, boş, mənasız, cəfəng; **2.** yüngülxasiyyət, yüngül, ədəbsiz

**fribble³** [ˈfrıbl] *v* **1.** boş-bikar gəzmək, tənbəllik etmək, veyllənmək, avara gəzmək; **2.** özünü yüngül aparmaq, ədəbsizlik etmək



**fricandel** [ˌfrıkænˈdel] *n fr.* frikadel *(xırda küftəyəoxşar xörək)*; tefteli *(xırda küftəyəoxşar yemək)*

**fricassee** [ˌfrıkəˈsi:] *n fr.* qovurma, bozartma

**friction¹** [ˈfrıkʃn] *n* **1.** sürtünmə; **to reduce ~** sürtünməni azaltmaq; **2.** toqquşma, mübahisə, dartışma, çəkişmə, ixtilaf, fikir ayrılığı, ziddiyyət; *There is friction between them Onların arasında ziddiyyət/ fikir ayrılığı var;* **3.** ovma, ovuşdurma, masaj, bədəni yaş dəsmalla sürtmə; **a cold shower with ~ afterwards** soyuq duşdan sonra bədəni ovma / ovuşdurma

**friction²** [ˈfrıkʃn] *v* sürtmək, ovuşdurmaq, ovxalamaq; ovmaq, masaj etmək

**frictional** [ˈfrıkʃənl] *adj* sürtünmə təsirilə hərəkət edən; ~ **resistance** sürtünmə müqavimətı/davamlılığı

**frictionize** [ˈfrıkʃnaız] *v* sürtmək, ovuşdurmaq, ovxalamaq, ovmaq, masaj etmək

**Friday** [ˈfraıdı] *n* cümə; **on ~** cümə günü

**fried** [fraıd] *adj* qızardılmış; ~ **fish** qızardılmış balıq; ~ **potatoes** qızardılmış kartof

**friend¹** [frend] *n* **1.** dost, aşna; **bosom/ sworn ~** ürək dostu, yaxın yoldaş, səmimi dost; **to be ~s with smb.** bir kəslə dostluq etmək/dost olmaq; **to make ~s with smb.** bir kəslə dostlaşmaq/dost olmaq; **2.** tanış; *Have you any friends here? Sənin / Sizin burada tanışın/tanışınız var? He is one of my friends O mənim tanışlarımdan biridir;* **3.** yoldaş, kolleqa *(peşə/ sənət /məktəb yoldaşı, həmkar, məsləkdaş)*; **our young ~s** bizim gənc dostlarımız; **4.** *d.d.* dost, sevgili, canan;

◊ **a ~ at / in court** nüfuzlu/ mötəbər/ sözükeçən dost; *A friend in need is a friend indeed at. söz. Yaxşı dost yaman gündə tanınar*

**friend²** [frend] *v* dostcasına münasibət bəsləmək/göstərmək, kömək/yardım etmək; **to ~ smb. in distress** bir kəsə çətin gündə kömək etmək

**friendless** [ˈfrendlıs] *adj* dostsuz, tək, tək-tənha, yalqız, dostları olmayan

**friendlike** [ˈfrendlaık] *adj* dostyana, səmimi, dostcasına

**friendliness** [ˈfrendlınıs] *n* dostluq, mehribanlıq, səmimilik, dostcasına əlaqə/münasibət, xeyirxahlıq; **to show smb. much ~** bir kəsə olduqca dostcasına münasibət bəsləmək/göstərmək

**friendly¹** [ˈfrendlı] *adj* **1.** mehriban, səmimi, dostyana münasibət göstərən; yoldaşlıq; xeyirxah, səmimi; **a ~ man** mehriban/ xeyirxah/səmimi adam; **to receive smb. in a ~ manner** bir kəsi mehribanlıqla qəbul etmək; **to be ~ with smb.** bir kəslə dostyana münasibətdə olmaq; **to be on ~ terms with smb.** bir kəslə dostluq etmək / yaxşı münasibətdə olmaq; ~ **match** *id.* yoldaşlıq görüşü; **2.** dost; ~ **nation** dost ölkə; **3.** ruhlandırıcı, ürəkləndirici, tərifləyici, təqdiredici, razılıq ifadə edən; **to be ~ to smth.** bir şeyi müdafiə etmək/bəyənmək/təqdir etmək; **4.** əlverişli, münasib, yararlı, müvafiq; ~ **wind** arxadan əsən/münasib külək, səmt küləyi; **5.** *hərb.* özününkü, düşmən olmayan; öz ordusuna mənsub olan; ~ **troops** öz qoşunları; ~ **information** öz qoşunları haqqında məlumat

**friendly²** [ˈfrendlı] *adv* dostcasına, mehribancasına, dostyana, səmimiyyətlə, xeyirxahlıqla; dostluqla, xeyirxahcasına; **to greet smb. ~** bir kəsi dostyana/mehribanlıqla/səmimiyyətlə salamlamaq

**friendship** [ˈfrendʃıp] *n* **1.** dostluq; **ties of the closest ~** ən yaxın dostluq telləri; *There is great friendship between them Onların arasında böyük dostluq var;* **to strike up a ~** dostlaşmaq, dost olmaq; **2.** mehribanlıq, səmimilik, dostcasına əlaqə /münasibət/xeyirxahlıq; **to show ~** mehribanlıq/səmimilik/xeyirxahlıq göstərmək;

◊ *Friendship cannot stand always on one side ≅ Dostluq həmişə qarşılıqlı olmalıdır. Dostluq heç vaxt birtərəfli ola bilməz*

**frigate** [ˈfrıgıt] *n* **1.** freqat *(üçdorlu hərbi gəmi)*; **2.** keşik çəkən hərbi gəmi; **3.** *zool.* freqat *(quş)*

**fright** [fraıt] *n* **1.** qorxu, vahimə, hürkü, diksinmə; **to have/to get a ~** qorxmaq, hürkmək, diksinmək, qorxuya düşmək, səksənmək; **to give smb. a ~** bir kəsi qorxutmaq/hürkütmək/diksindirmək/qorxuya salmaq; **to recover from a ~** qorxudan/ vahimədən özünə gəlmək; **2.** *d.d.* uyuq, qorxuluq, qorxunc/bədheybət şey, div, idbar *(adam)*; **to look a perfect ~** çox pis görünmək; müqəvvaya oxşamaq; *Her clothes were a fright Onun geyimindən adam qorxurdu. Onun geyimi heybətli idi*

**frighten** [ˈfraıtn] *v* qorxutmaq, hədələmək, hürkütmək; **to be ~ed of smth.** bir şeydən qorxmaq/hürkmək; **to ~ smb. into submission** bir kəsi qorxu ilə tabe olmağa məcbur etmək; **to ~ out of doing smth.** qorxutma yolu ilə bir kəsi bir şeydən imtina etməyə/boyun qaçırmağa məcbur etmək; **to ~ smb. out of his wits** bir kəsi bərk qorxutmaq, bir kəsi qorxudub ağlını çaşdırmaq

**frightened** [ˈfraıtnd] *adj* qorxudulmuş, hürküdülmüş, qorxmuş, hürkmüş; ~ **child** qorxudulmuş / qorxmuş uşaq

**frightful** [ˈfraıtfl] *adj* **1.** qorxulu, qorxunc, dəhşətli, vahiməli, müdhiş; ~ **tempest/ accident** dəhşətli tufan / hadisə; **2.** *d.d.* eybəcər, çirkin, iyrənc, kifir, idbar, pis; ~ **houses** eybəcər/pis evlər; ~ **dress** eybəcər/pis paltar; **3.** çox şiddətli, güclü, bərk; ~ **noise** güclü səs/ səs-küy

**frightfully** ['fraɪtfəlɪ] *adv* olduqca, çox, həddən artıq, çox pis, son dərəcə; **to roar ~** bərk bağırmaq/nərildəmək; **to look ~ well** olduqca yaxşı görünmək; *It is a frightfully good thing Bu, çox yaxşıdır! Bu, əladır!*

**frightless** ['fraɪtlɪs] *adj* qorxmaz, qoçaq, cəsarətli, mərd

**frigid** ['frɪdʒɪd] *adj* **1.** soyuq; **~ climate** soyuq iqlim; **~ zone** arktik qurşaq, qütb zonası; **2.** soyuq, ehtirassız, həvəssiz, laqeyd; **~ manner** soyuq davranma; **~ smile** soyuq təbəssüm; **~ tone** soyuq ton; **to look down on** *smb.* **with ~ indifference** bir kəsə soyuq/laqeyd münasibət göstərmək

**frigidity** [frɪ'dʒɪdɪtɪ] *n* **1.** şaxtalıq, soyuqluq; **~ of the air** havanın soyuqluğu/şaxtalığı; **2.** donuşluq; **eternal ~** əbədi donuşluq; **3.** soyuqluq; laqeydlik; **~ of demeanour** davranışın/rəftarın soyuqluğu

**frigidly** ['frɪdʒɪdlɪ] *adv* soyuq; ehtirassız, həvəssiz, soyuq bir surətdə; **to smile ~** həvəssiz şəkildə gülümsəmək; **to speak ~** soyuq tonda/tərzdə danışmaq

**frigotherapy** [ˌfrɪgə'θerəpɪ] *n tib.* soyuqla müalicə

**frill**[1] [frɪl] *n* **1.** büzmə, oborka *(qadın paltarının kənarlarına tikilən büzmələr),* büzmə haşiyə *(nazik parçadan);* **to decorate a dress with ~s** paltarı büzmə/oborka ilə bəzəmək; **2.** jabo *(köynək yaxasında krujevadan büzməli haşiyə; dik yaxalıq);* **3.** *d.d.* gərəksiz, lazımsız bəzək, zinət, bəzək-düzək; **a style with too many ~s** həddindən artıq qəliz/təmtəraqlı üslub; **4.** *pl* üz-gözünü büzüşdürmə, özünü əzmə, əzilib-büzülmə; **5.** *amer. d.d.* delikates, məzə *(zərif yemək)*

◊ **to put on (*one's*) ~s** naz etmək, özünü çəkmək/naza qoymaq, özünü əzib-büzmək, təkəbbürlənmək, lovğalanmaq, qudurmaq

**frill**[2] [frɪl] *v* **1.** büzmə haşiyə ilə bəzəmək; **to ~ a dress** paltarı büzmə/oborka/büzmə haşiyə ilə bəzəmək; **2.** *tex.* büzmələmək, büzmək

**frilled** [frɪld] *adj* **1.** büzmə/oborka ilə bəzənmiş/bəzədilmiş; **2.** *tex.* büzmələnmiş, büzməli

**frillies** ['frɪlɪz] *n pl d.d.* büzməli/oborkalı alt yubka

**frilling** ['frɪlɪŋ] *n* **1.** büzmə/oborka/qat və s. ilə bəzəmə; **2.** büzmə/oborka; büzmələr, oborkalar

**frilly** ['frɪlɪ] *adj* **1.** büzmələrlə/oborkalarla/büzmə haşiyə və s. ilə bəzənmiş/bəzədilmiş; **2.** bəzədilmiş, bəzənmiş, çiçəklə örtülü, çiçəkli, əlvan, alabəzək, naxışlı

**frim** [frɪm] *adj* **1.** şirəli, sulu; **2.** bol, çox

**fringe**[1] [frɪndʒ] *n* **1.** saçaq; **the ~ of a curtain/of a shawl** pərdənin/şalın saçağı; **2.** zülf, tel; **3.** haşiyələnmə, haşiyələmə; haşiyə, kənar; **a ~ of houses round a lake** gölü əhatə edən/əhatəyə alan evlər; **4.** kənar; dar haşiyə; **on the ~ of the forest** meşənin kənarında; **the boy from the ~s of the town** şəhər ətrafından olan oğlan; **the outer ~(s) of London** Londonun kənar sərhədləri; **~ benefits** əlavə güzəştlər/imtiyazlar *(təqaüdlər, ödənilən məzuniyyətlər)*

**fringe**[2] [frɪndʒ] *v* **1.** saçaqla bəzəmək; **to ~ a rug** xalçanı saçaqla bəzəmək; **2.** dövrələmək, əhatə etmək; *Houses fringed the road on either side Yolu hər iki tərəfdən evlər əhatə edirdi*

**fringy** ['frɪndʒɪ] *adj* **1.** saçaqlı; **2.** saçaqla bəzədilmiş; **3.** dövrələnmiş, əhatə olunmuş

**frippery**[1] ['frɪpərɪ] *n* **1.** zahiri bəzək, bər-bəzək; bəzək-düzək, oyun-oyuncaq; ucuz bəzək, zinət; **2.** iddialılıq, lovğalıq; **3.** *arx.* köhnə şeylər, köhnə-kürüş; cır-cındır, nimdaş paltar, əsgi-üsgü, zir-zibil, dəyərsiz şeylər; **4.** *arx.* köhnə şeylər / köhnə-kürüş/cır-cındır nimdaş paltar alveri, köhnə şeylər alverçisinin dükanı

**frippery**[2] ['frɪpərɪ] *adj* saxta, zahiri, yalançı; süni

**frisette** [frɪ'zet] *n* burulmuş/buruq saçlar; zülf, tel, alında zülflər/saçlar/tellər, qıvrım cıqqa/cığa

**friseur** [frɪ:'zə:] *n fr.* dəllək, bərbər

**frisk**[1] [frɪsk] *n* **1.** sıçrayış, atılma, hoppanma, tullanma, sıçrama; **2.** zarafat, şadlıq, şənlik, nəşə, əyləncə

**frisk**[2] [frɪsk] *v* **1.** oynamaq, oynaqlaşmaq, gülüb-oynamaq, atılıb-düşmək, atılmaq, hoppanmaq, tullanmaq, sıçramaq *(uşaqlar, cavan heyvanlar haq.); Lambs were frisking (about) in the meadow Quzular çəmənlikdə oynaqlaşırdılar / atılıb-düşürdülər;* **2.** yelləmək *(yelpiklə);* bulamaq *(quyruğunu);* **3.** *amer. jarq.* axtarmaq *(adamın üstünü);* **4.** almaq, götürmək *(axtarış zamanı)*

**friskiness** ['frɪskɪnɪs] *n* gümrahlıq, şuxluq, oynaqlıq; cəldlik; yüngüllük

**frisky** ['frɪskɪ] *adj* **1.** şux, oynaq, oynağan, gümrah, cəld; **~ kitten** oynağan pişik balası; **2.** şən, işvəli, şivəli; yüngül; diri, diribaş, çevik, zirək, qıvraq

**fritter**[1] ['frɪtə^r] *n* I oladya *(buğda unundan bişirilən kökə),* ponçik *(içi mürəbbəli/şirnili kömbə qoğal)*

**fritter** ['frɪtə^r] *n* II kiçik parça / tikə; dilim, fal, qalıq, artıq

**fritter**[2] ['frɪtə^r] *v* **1.** kiçik/xırda/balaca hissələrə bölmək; **2.** xırda hissələrə bölünmək / parçalanmaq

**frivolity** [frɪ'vɔlɪtɪ] *n* **1.** yüngülxasiyyətlilik, dəmdəməkilik, yelbeyinlik, yüngüllük; arsızlıq; yüngül hərəkət; **a life of endless ~** yüngül/mənasız həyat tərzi; **2.** yüngüllük, ədəbsizlik; ədəbsiz söz

**frivolous** ['frɪvələs] *adj* **1.** yüngülxasiyyət, dəmdəməki, yelbeyin, yüngül, arsız, boş *(adam haq.);* **~ person** yüngül/arsız *(adam);* **2.** səthi, yüngül, boş; **~ book** səthi kitab; **3.** ədəbsiz; **~ joke** ədəbsiz zarafat; **4.** əhəmiyyətsiz, mənasız, cəfəng, kiçik, balaca, cüzi; **~ argument** əhəmiyyətsiz dəlil; **~ objection** mənasız etiraz; **5.** *hüq.* əsassız *(iddia, tələb və s. haq.)*

**frivolously** ['frɪvələslɪ] *adv* **1.** yüngül, düşüncəsiz; səthi, üzdən, ötəri; **2.** yüngül, ədəbsiz halda; **3.** əhəmiyyətsiz dərəcədə

**frivolousness** ['frɪvələsnɪs] *n* = **frivolity**

**frizz**[1] [frɪz] *n* **1.** qıvrım saçlar; **2.** bərk burulmuş parik *(qoyma / süni saç)*

**frizz**[2] [frɪz] *v* **1.** hörmək, burmaq, burdurmaq *(saçı);* **2.** qıvrılmaq, burulmaq *(saç haq.);* **3.** fışıldamaq, çartıldamaq, çırtıldamaq *(qızartma, qovurma zamanı)*

**frizzed** ['frɪzd] *adj* hörülmüş, burulmuş, buruq

**frizzle**[1] ['frɪzl] *n* **1.** hörmə, hörülmə, burma, burdurma; buruq saç, zavivka; **2.** sıx qıvrım saç; bərk buruq, burum, qıvrım *(saçda, yazıda, naxışda)*

**frizzle**[2] ['frɪzl] *v* **1.** hörmək, burmaq, burdurmaq *(saçı);* **2.** burulmaq, qıvrılmaq; **3.** qızartmaq *(fişıltı ilə);* **4.** yandırmaq; **to get ~d** yanmaq, yandırmaq *(özünü);* **5.** istidən qüvvətdən /haldan /taqətdən düşmək, istidən üzülmək/yorulmaq/zəifləmək; *I was frizzling in Baghdad for months Mən bir neçə ay ərzində Bağdadda istidən bişirdim*

**frizzly** ['frɪzlɪ] *adj* qıvrımsaç, buruqsaç, hörülmüş, burulmuş, buruq; **~ hair** burulmuş / buruq saç

**frizzy** ['frɪzɪ] *adj* = **frizzly**

**frock**[1] [frɔk] *n* **1.** qadın /uşaq paltarı; **a light summer ~s** yüngül yay paltarı; **to wear short ~s** qısa paltar geymək; **to think only of ~s** ancaq geyim / paltar / bəzək-düzək haqqında fikirləşmək; **2.** keşiş cübbəsi, əba; **to wear the ~** keşiş cübbəsi/ əbası geymək, keşiş olmaq; **3.** *d.d.* rahib; **4.** köynək, alt paltarı; **5.** xalat, iş üst köynəyi *(bluza)*

**frock**[2] [frɔk] *v* **1.** bir kəsə paltar/keşiş cübbəsi/əba geydirmək; **2.** yüksək dini rütbəyə keçirmək

**frock-coat** ['frɔk'kout] *n* sürtük *(uzunətəkli kişi pencəyi)*

**frog** [frɔg] *n* **1.** *zool.* qurbağa; **2.** haça *(heyvan dırnağında);* **3.** *jarq.* fransız

**frog-bit** ['frɔgbɪt] *n bot.* qurbağaotu

**frog-eater** ['frɔgˌi:tə^r] *n jarq.* qurbağa yeyən fransız

**frog-fish** ['frɔgfɪʃ] *n zool.* dəniz siçanı

**froggery** ['frɔgərɪ] *n* **1.** qurbağaların toplanması; **2.** qurbağa yetişdirilən yer

**froggy**[1] ['frɔgɪ] *n* **1.** balaca qurbağa; **2. Froggy** fransız

**froggy**[2] ['frɔgɪ] *adj* **1.** qurbağa; **~ eyes** qurbağa gözlər; **2.** qurbağa ilə bol olan; **~ pond** qurbağa çox olan süni göl

**frog-in-the-throat** ['frɔgɪndə'θrout] *n* xırıltı; **to have a ~** xırıldamaq; xırıltılı səslə danışmaq

**frogland** ['frɔglænd] *n* I qurbağa çox olan bataqlıq yer

**Frogland** ['frɔglænd] *n* II *jarq.* Hollandiya

**Froglander** ['frɔgˌlændə^r] *n jarq.* hollandiyalı, hollandiya əhli

**frogling** ['frɔglɪŋ] *n* qurbağa balası

**frog-pecker** ['frɔgˌpekə^r] *n d.d.* vağ *(quş)*

**froise** [frɔɪz] *n* bekon *(duzlanıb hisə verilmiş donuz əti)* ilə bişirilmiş omlet *(un və südlə çalınmış yumurtanın qayğanağı)*

**from** [frɔm] *prep* **1.** *Məkan mənasında aşağıdakıları bildirir:* 1) *hərəkətin çıxış nöqtəsini:* **-dan, -dən;** *They started from Moscow Onlar Moskvadan getdilər/ yola düşdülər;* **to go away ~ home** evdən getmək / çıxıb getmək; **to come ~ school** məktəbdən evə gəlmək; **~ here** buradan; **~ there** oradan; **~ where** haradan; *It fell from the roof Bu, damdan düşdü; He took the book from the shelf O, kitabı rəfdən götürdü;* **to take a handkerchief ~ *one's* pocket** dəsmalı/yaylığı cibindən götürmək; **to jump ~ the train** qatardan atılmaq; *I heard it from the next room Mən bunu qonşu otaqdan eşitdim; Great birds lifted themselves from the water Böyük quşlar sudan qalxdılar;* 2) *məsafənin çıxış nöqtəsini:* **-dan, -dən;** *The town is not far from the station Şəhər stansiyadan uzaq deyil;* 3) *bir əşyanın yaxud onun hissəsinin başqa əşyaya görə vəziyyətini:* **-dan, -dən;** **to hang ~ a bough** budaqdan asmaq/asılmaq; *A lamp hung from the ceiling Lampa tavandan asılmışdı;* **2.** *Zaman mənasında aşağıdakıları bildirir:* 1) *prosesin ilk / başlanğıc anını: Bu halda* **from** *Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçilərinə uyğun gəlir;* **-dan, -dən:** **five years ~ now** beş ildən sonra; **~ the very first** elə lap başlanğıcdan; **reckoning ~ yesterday** dünənki gündən sayaraq; **~ 1920** 1920-ci ildən; *I know him from a child Mən onu uşaqlıqdan tanıyıram;* 2) *tarixi: Bu halda* **from** *Azərbaycan türkcəsində yönlük hal şəkilçilərinə uyğun gəlir;* **-a, -ə:** *The monument dates from the 16th century Bu abidə 16-cı əsrə aiddir;* **as ~ September 1st** Sentyabrın 1-dən başlayaraq; 3) *mənbəyi və ya yeri:* **-dan, -dən;** **a present ~ his father** onun atasından hədiyyə; *He is from Minsk O, Minskdəndir;* **water ~ well** quyudan götürülən su; **a quotation ~ Tolstoy** Tolstoydan sitat; **broadcast ~ Moscow** Moskvadan radioverilişi; **words ~ the heart** qəlbdən gələn sözlər; **~ Mr. Smith** cənab Smitdən *(poslka, bağlama üzərində yazı); I heard it from him Mən bunu ondan eşitdim; I have it from reliable sources Mən bunu etibarlı mənbələrdən bilirəm;* **to buy/to borrow *smth.* ~ *smb.*** bir kəsdən bir şey almaq *(borca); He borrowed a book from his friend O, yoldaşından kitab borc aldı;*

**to take away a toy ~ a child** oyuncağı uşaqdan almaq; 4) *hansı dildən edilən tərcüməni*: **-dan, -dən; to translate ~ one language into another** bir dildən başqa dilə tərcümə etmək; **to translate ~ English into Azerbaijani Turkish** ingilis dilindən Azərbaycan türkcəsinə tərcümə etmək; 3. *Səbəb, arzu bildirir*; **-dan, -dən; to be weak /to die ~ an illness/hunger** xəstəlikdən/aclıqdan zəifləmək/ölmək; **to suffer ~ the heat** istidən əzab çəkmək; *It happened from carelessness Bu, etinasızlıqdan baş verdi;* **not ~ any fault of his own** özünün təqsiri üzündən olmayan; 4. *Səbəb bildirir: Bu halda* **from** *Azərbaycan türkcəsində yönlük və ya çıxışlıq hal şəkilçilərinə uyğun gəlir;* **-a, -ə; -dan, -dən: to judge ~ *smb.'s* conduct** hərəkətinə görə mühakimə etmək; **to judge ~ appearances** xarici görünüşə görə mühakimə yeritmək; **to know ~ experience** təcrübədən bilmək; **~ *smb.'s* point of view** bir kəsin nöqteyi-nəzərindən; **to speak ~ memory** əzbərdən danışmaq; **to draw a conclusion ~ *smth.*** bir şeydən nəticə çıxartmaq; 5. *Bir şeydən qorunma/ qorunma/özünü saxlamanı/çəkinməyi bildirir: Bu halda* **from** *Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçilərinə uyğun gəlir;* **-dan, -dən; protection of buildings ~ lightning** binaların ildırımdan qorunması; **to shelter ~ the rain** yağışdan gizlənmək; **to prevent *smb.* ~ doing *smth.*** bir kəsi bir şey etməkdən çəkindirmək; *I prevented him from sending this telegram Mən onu bu teleqramı göndərməkdən çəkindirdim;* **to refrain / to abstain ~ *smth.*** bir şeydən çəkinmək; 6. *Bir kəsin/şeyin azad / xilas edilməsini bildirir: Bu halda* **from** *Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçilərinə uyğun gəlir;* **-dan, -dən:** *He was released from prison Onu həbsxanadan azad etdilər;* **exemption ~ taxation** vergilərdən azad etmə; **to free ~ an obligation** öhdəlikdən azad etmək; *He was exempted from military service Onu hərbi xidmətdən azad etdilər; He was expelled from school Onu məktəbdən çıxartdılar/qovdular;* 7. *Bir şeyi bir kəsdən gizlətməyi bildirir: Bu halda* **from** *Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçilərinə uyğun gəlir;* **-dan, -dən; to hide/to conceal *smth.* ~ *smb.*** bir şeyi bir kəsdən gizlətmək; **to keep *smth.* ~ others** bir şeyi başqalarından gizlətmək; 8. *Əşyadan/Hadisədən məhrum edilməni bildirir: They were cut off from civilization Onlar cəmiyyətdən ayrılmışdılar / əlaqələri kəsilmişdi;* 9. *Vidalaşmanı, ayrılmanı bildirir:* **-dan, -dən;** *The girl parted from him Qız ondan ayrıldı; They parted from one another Onlar bir-birindən ayrıldılar;* 10. *Çıxmanı bildirir (bir ədədi o birindən):* **to take/to subtract six ~ ten** ondan altı çıxmaq; 11. *Tutuşdurmanı, müqayisə etməni, qarşılaşdırmanı bildirir:* **-dan, -dən: to distinguish good ~ bad** yaxşını pisdən ayırmaq; **to differ /to be different/to be distinct ~ others** başqalarından fərqlənmək/ayrılmaq/seçilmək; **to tell / to know one thing ~ another** bir şeyi o birindən fərqləndirmək; *I cannot tell him from his brother Mən onu qardaşından ayıra bilmirəm;* 12. *Bir şəxsin vəziyyətinin dəyişməsini bildirir:* **-dan, -dən:** *From the attacked he had become the attacker O, müdafiəçidən hücumçuya çevrildi; From a youth he became a grown up man O, cavan oğlandan yaşa dolmuş kişiyə çevrildi;* 13. *Bir şeyin hansı materialdan düzəldiyini bildirir:* **-dan, -dən:** *Wine is made from grapes Şərab üzümdən düzəldilir;* 14. *Adı çəkilən şəxsi və ya xud əşyanı bildirir: The library was named from the founder Kitabxana yaradıcısının şərəfinə adlandırılıb;* 15. *Birləşmələrdə işlədilir:* **-dan, -dən; ~ above** yuxarıdan; *The light falls from above İşıq yuxarıdan düşür;* **~ across** ...dalından, ...arxasından, ...o tayından, ...o tərəfindən; **~ across the sea** dənizin o tayından; **~ afar** uzaqdan; *I saw him from afar Mən onu uzaqdan gördüm;* **~ among, ~ amongst** içindən; *He came forth from amongst the crowd O, dəstədən/camaatın içindən irəli çıxdı, O, dəstədən ayrıldı;* **~ before** əvvəlki, qabaqkı; *That dates from before the war Bu, müharibədən əvvəlki vaxta aiddir;* **~ behind** arxasından; *He appeared from behind the house O, evin arxasından çıxdı/peyda oldu;* **~ below** aşağıdan; *I heard a voice from below Mən aşağıdan səs eşitdim;* **~ between** arasından; *He plucked a cigarette stub from between his lips O, siqaret kötüyünü dodaqlarının arasından çıxartdı;* **~ beyond** arxasından; *He came from beyond the mountains O, dağların arxasından gəldi;* **~ inside** içəridən; *The door was locked from inside Qapı içəridən bağlanmışdı;* **~ off** -dan, -dən; *Take it from off my heart Bu yükü mənim ürəyimdən/qəlbimdən çıxart/ çıxardın;* **~ out of depths** dərinlikdən; **~ outside** bayırdan; *He entered from outside O bayırdan içəri girdi;* **~ over** üstündən; *He looked at the girl from over his spectacles O, qıza eynəyinin üstündən baxdı;* **~ round** tindən; *He appeared from round the corner of the street O, küçənin tinindən çıxdı /peyda oldu;* **~ ...till -dan, -dən, ...qədər; ~ four till six o'clock** saat dörddən altıya qədər; **~... to** *Başlanğıc və son nöqtəni və ya vaxtı göstərir:* **-dan, -dən ...qədər; ~ London to Paris** Londondan Parisə qədər; **~ morning to night** səhərdən axşama qədər; **~ five to six** beşdən altıya qədər; 16. *Aşağı və yuxarı həddi göstərir:* **-dan, -dən ...qədər;** *This bird lays from four to six eggs Bu quş dörddən altıya qədər yumurta qoyur; The price has been increased from six pence to a shilling Qiymət altı pensdən bir şillinqə qədər artıb;* 17. *Zərflik ifadələrində uzunsürən və ya təkrar olunan prosesi bildirir:* **-dan, -dən; ~ day to day** gündən-günə; **~ hand to hand** əldən-ələ; **~ mouth to mouth** ağızdan-ağıza; **~ side to side** bir tərəfdən o biri tərəfə; **~ generation to generation** nəsildən-nəslə; **~ time to time** hərdənbir, bəzən; **~ under / underneath** altından; **to come out ~ under the ground** yerin altından çıxmaq; **far ~** heç də, qətiyyən, əsla; *He is far from being clever O heç də ağıllı deyil; I am far from saying that... Mən heç də demək istəmirəm ki,...;* **to be away / absent ~** olmamaq, gəlməmək, iştirak etməmək; **~ of old** çoxdan, qədimdən; *I know it from of old Mən bunu çoxdan bilirəm*



**front**[1] [frʌnt] *n* 1. qabaq, ön, üz tərəf; *Look to your front Qabağına/Qabağınıza bax/ baxın; The table of contents is in the front of the book Mündəricat kitabın əvvəlindədir;* 2. ön plan; **to come to the ~** ön plana çıxmaq; irəli gəlmək; diqqəti özünə cəlb etdirmək; özünə qarşı maraq oyandırmaq; mühüm vəzifə tutmaq; gözə çarpmaq; **to bring to the ~** üzə/aşkara çıxartmaq; inkişafa / irəliləyişə kömək etmək; 3. fasad *(binanın ön tərəfi);* **the fine ~ of a house** evin gözəl fasadı; 4. *şair.* alın; sifət, üz, sima, surət; 5. *d.d.* üz; **~ to ~** üz-üzə, üzbəüz; 6. *hərb.* cəbhə; **at the ~** cəbhədə; **to go to the ~** cəbhəyə getmək; **to be invalided back from the ~** cəbhədən əlil/şikəst qayıtmaq; 7. cəbhə, birlik, təşkilat, ittifaq, həmrəylik; **the people's/popular ~** xalq cəbhəsi; **united ~** vahid cəbhə; 8. sahil boyunda olan zona; sahil, dəniz kənarı; dəniz sahilindəki bulvar; ◊ **to change ~** mövqeyi/münasibəti dəyişmək; **to show a bold ~** cəsarət göstərmək, ruhdan düşməmək

**front**[2] [frʌnt] *adj* 1. qabaq; **~ tooth** qabaq / kəsici diş; **~ elevation** qabaq fasad; **~ seats** qabaq yerlər; qabaq sırada olan yerlər; **~ screen/glass** qabaq şüşə *(avtomobildə);* 2. *fon.* ön; **~ vowels** ön saitlər

**front**[3] [frʌnt] *v* 1. ...a/yə baxmaq, ...ya/yə yönəldilmiş olmaq; *The house fronts the square Ev meydana baxır;* 2. bir şeyin qarşısında olmaq/yerləşmək; **a lawn ~ing the house** evin qarşısında olan çəmənlik; 3. üz çəkmək, fasadı bəzəmək; *The house is fronted with bricks Evə kərpicdən üz çəkilib*

**frontage** ['frʌntɪdʒ] *n* 1. qabaq fasad; 2. bina ilə yol arasında olan torpaq sahəsi; kiçik bağça; 3. çaya / yola bitişik olan torpaq parçası; 4. *hərb.* cəbhənin eni; **~ of the attack** hücum cəbhəsinin eni

**frontier**[1] ['frʌntjə<sup>r</sup>] *n* 1. sərhəd; **distant/ long ~** uzaq/uzun sərhəd; **Italy's French ~** İtaliyanın Fransa ilə sərhədi; **to defend *one's* ~s** öz sərhədlərini müdafiə etmək/ qorumaq; **to cross the ~** sərhədi keçmək; 2. sərhəd boyu zona; 3. hədd, hüdud, son hədd; **~s of knowledge** biliyin son hədləri; 4. *arx.* sərhəd boyunda olan qala / hərbi istehkam

**frontier**[2] ['frʌntjə<sup>r</sup>] *adj* sərhəd; **a ~ town** sərhəd şəhəri; **a ~ incident** sərhəd münaqişəsi/toqquşması; **~ problems** sərhəd problemləri; **a ~ zone** sərhəd zonası

**frontier(s)man** [frʌn'tɪə(z)mən] *n (pl* **-men** mən**)** 1. sərhəd boyu zonanın sakini; 2. *amer. tar.* təzə yerə köçürülmüşlər, mühacirlər, kolonistlər, koloniyada yaşayanlar *(Qərbdə məskən salanlar haq.)*

**front page**[1] ['frʌnt'peɪdʒ] *n* 1. titul vərəqi, titul; 2. birinci səhifə *(qəzetdə)*

**front page**[2] ['frʌnt'peɪdʒ] *adj* 1. birinci səhifədə dərc olunan *(qəzetdə);* **~ news** fövqəladə sensasiyaya səbəb olan xəbərlər; 2. çox əhəmiyyətli / mühüm; çox ciddi / qiymətli

**front page**[3] ['frʌnt'peɪdʒ] *v* 1. birinci səhifədə dərc etmək *(qəzetdə);* 2. birinci səhifədə çıxmaq *(qəzetdə)*

**front pager** ['frʌnt.peɪdʒə<sup>r</sup>] *n amer. d.d.* fövqəladə sensasiyaya səbəb olan xəbər; mühüm xəbər

**front rank** ['frʌnt'ræŋk] *adj* 1. qabaqcıl, mütərəqqi; 2. ən/lap yaxşı, əla; 3. ən əhəmiyyətli/mühüm; **of ~ importance** ən ümdə əhəmiyyətli

**front runner** ['frʌnt.rʌnə<sup>r</sup>] *n* 1. lider *(qaçışda, cıdırda);* 2. ehtimal edilən namizəd *(hər hansı vəzifəyə);* **~ for top nomination** seçkilərdə prezident vəzifəsinə namizəd

**frost**[1] [frɔst] *n* 1. şaxta, don, ayaz; **five degrees of ~** beş dərəcə şaxta; **black ~** qırovsuz don /şaxta; **sharp/hard /biting ~** bərk /kəskin şaxta; **ringing ~** çox şiddətli soyuq, bərk şaxta; **light ~** yüngül şaxta; *The fruit has been damaged by frost Meyvə şaxtadan/ayazdan zərər çəkib;* 2. şaxtalar, soyuqlar; **early ~s** erkən düşən şaxtalar; 3. qırov; **grass covered with ~** qırovla örtülmüş ot; 4. soyuqluq, sərtlik; *There is a frost in his manner Onun xasiyyətində sərtlik/soyuqluq var;* 5. *d.d.* müvəffəqiyyətsizlik, uğursuzluq; *The book turned out a frost Kitab uğursuzluğa düçar oldu*

**frost**[2] [frɔst] *v* 1. şaxta vurmaq *(bitkiləri);* 2. soyuq /şaxta düşmək; 3. qırovla örtülmək; 4. şir/mina çəkmək/ilə örtmək; 5. tutqunlaşdırmaq *(şüşəni)*

**frost-bird** ['frɔstbə:d] *n* 1. şaxtalar başlananda uçub gələn quş; 2. *zool.* kürən cüllüt, çovdarçı

**frostbitten** ['frɔst.bɪtn] *adj* don/şaxta/ayaz vurmuş; **~ trees** don/ayaz vurmuş ağaclar

**frost-bound** ['frɔstbaund] *adj* şaxtadan donmuş; donmuş, buz bağlamış; dondurulmuş; *The garden's still frostbound; it's useless to think of planting anything Bağ hələ də dondur; heç nə əkmək olmaz*

**frost-dew** ['frɔstdju:] *n* qırov
**frosted** ['frɔstɪd] *adj* 1. qırovla örtülmüş; ~ **ground** qırovla örtülmüş torpaq; 2. tutqunlaşdırılmış, tutqun *(şüşə haq.)*; ~ **glass** tutqunlaşdırılmış/kələ-kötür/nahamar şüşə; 3. şirələnmiş ; ~ **cake** şirələnmiş tort
**frost-grape** ['frɔstgreɪp] *n* amerikan yabanı üzümü
**frost-hardy** ['frɔst.ha:dɪ] *adj* şaxtadan qorxmayan, şaxtayadavamlı *(bitki haq.)*
**frostily** ['frɔstɪlɪ] *adv* soyuq, təmkinlə, səbirlə, ehtiyatla
**frosting** ['frɔstɪŋ] *n* 1. şirləmə, minalama, şirələmə; 2. qırov, şaxtalı naxış *(pəncərədə)*; 3. dondurma, dondurulma; bərk soyutma; 4. tutqunluq *(şüşədə)*
**frost-mist** ['frɔstmɪst] *n* qırov
**frostproof** ['frɔstpru:f] *adj* şaxtadan qorxmayan, şaxtayadavamlı
**frosty** ['frɔstɪ] *adj* 1. şaxtalı; ~ **night** şaxtalı gecə; ~ **sky** şaxtalı səma; 2. qırovla örtülmüş; ~ **grass/ground** qırovla örtülmüş ot/ torpaq; 3. *şair.* saçı ağarmış/çallaşmış; ~ **head** çalbaş; 4. soyuq, laqeyd; ~ **nature** soyuq təbiət/xasiyyət; ~ **greeting** soyuq /laqeyd salamlama
**froth**[1] [frɔθ] *n* 1. köpük; **beer covered with** ~ köpüklənən pivə; 2. cəfəngiyyat, boş / mənasız söz, yalan; boşboğazlıq, boş danışıq / söhbət; *This talk is all froth Bu söhbət cəfəngiyyatdır/boşboğazlıqdır*
**froth**[2] [frɔθ] *v* 1. köpüklənmək, qaynayıb köpürmək; köpük ilə örtülmək; *A mad dog froths at the mouth Qudurmuş itin ağzından köpük gəlir;* 2. tərləmək, köpüklənmək, köpük ilə örtülmək *(at haq.)*; 3. köpüklətmək, köpükləndirmək; çalmaq; **to ~ eggs** yumurta çalmaq; 4. boşboğazlıq / gəvəzəlik / lağlağılıq etmək
**froth-blower** ['frɔθ.blouəʳ] *n* həmişə pivəxanaya gələn
**frothy** ['frɔθɪ] *adj* 1. köpüklü; ~ **beer** köpüklü pivə; 2. boş, yüngül, yüngülçəkili, 3. *məc.* boşboğaz, gəvəzə, naqqal; ~ **speaker** gəvəzə/boşboğaz/ naqqal natiq
**frown**[1] [fraun] *n* 1. çatılmış qaşlar; **a ~ on** ***smb.'s*** **brow** qaşqabaqlı alın; 2. qaşqabaqlı, üzügülməz, narazı sifət / üz; **to be met /greeted with a** ~ soyuq qarşılanmaq
**frown**[2] [fraun] *v* 1. qaşqabağını tökmək, sımsırığını sallamaq; qaşlarını çatmaq; *He frowned trying to remember something O, qaşlarını çatıb nəyi isə yadına salmağa çalışdı*; 2. pis baxmaq, mənfi münasibət bəsləmək; **to ~ upon an evil habit** pis adətlərə mənfi münasibət bəsləmək/göstərmək; **to ~ at** ***smb.*** bir kəsə pis baxmaq; *Her whole family frowned on the match Onun bütün ailəsi onun nikahından narazı idi*; 3. **(into)** baxışı ilə buyurmaq / əmr etmək; **to ~** ***smb.*** **into doing** ***smth.*** baxışla bir kəsi bir şey etməyə buyurmaq; 4. bəyənmədiyini göstərmək/bildirmək; **to ~ disapproval** narazılıq bildirmək; **to ~ down** acıqlı baxışı ilə itaət etməyə məcbur etmək
**frowner** ['fraunəʳ] *n* qəmgin / qaşqabaqlı adam
**frowning** ['fraunɪŋ] *adj* 1. qaşqabaqlı; sərt, acıqlı; ~ **face** acıqlı / qaşqabaqlı üz; 2. zəhmli, qorxulu, təhlükəli; vahiməli; ~ **cliff** təhlükəli sıldırım qaya
**frowningly** ['fraunɪŋlɪ] *adv* qaşqabaqla, qaşqabaqlı, tutqun; çox sərt/şiddətli, acıqlı, çox ciddi
**frowny** ['fraunɪ] *adj* qaşqabaqlı, qaraqabaq, üzügülməz, tutqun, sərt
**frowst**[1] [fraust] *n d.d.* bürkü, isti, boğanaq, ağır hava *(otaqda)*
**frowst**[2] [fraust] *v* boş-bikar gəzmək, veyllənmək, avara gəzmək
**frowsty** ['fraustɪ] *adj d.d.* üfunətli, ağır, bürkülü *(hava haq.)*
**frowziness** ['frauzɪnɪs] *n* 1. bürkü, isti, boğanaq; üfunət; 2. pintilik, səliqəsizlik; 3. kəskinlik, həmahəng olmama, düz/uyğun gəlməmə
**frowzy** ['frauzɪ] *adj* 1. üfunətli, ağır *(hava)*; boğanaqlı, bürkülü, bürkü; qoxumuş, üfunətli; ~ **room** havası dəyişilməmiş/boğanaq otaq; 2. çirkli, pinti, səliqəsiz; daranmamış, pırpız; 3. qıpqırmızı, tünd qırmızı *(üzün rəngi haq.)*; 4. həmahəng olmayan, düz / uyğun gəlməyən
**frozen**[1] ['frouzn] *adj* 1. donmuş, donub qalmış; ~ **feet** donmuş ayaqlar; ~ **to death** soyuqdan məhv olmuş; ~ **brook** donmuş kiçik çay; 2. dondurulmuş; ~ **meat** dondurulmuş ət; 3. soyuq, çox soyuq, buz kimi; **the ~ zones** qütb zonası; 4. donuq, soyuq, təmkinli, səbirli, ehtiyatlı; ~ **stare** donuq/soyuq baxış
**frozen**[2] ['frouzn] *v* **freeze**[2] *felinin pp forması*
**fructiferous** [frʌk'tɪfərəs] *adj biol.* meyvə / bar / məhsul verən
**fructification** [.frʌktɪfɪ'keɪʃn] *n biol.* meyvə / bar / məhsul vermə
**fructificative** ['frʌktɪfɪ.keɪtɪv] *adj biol.* meyvə / bar / məhsul verən
**fructify** ['frʌktɪfaɪ] *v biol.* 1. meyvə / bar / məhsul vermək; 2. münbit/məhsuldar/bərəkətli etmək, zənginləşdirmək; **to ~ the earth** torpağı münbit / məhsuldar etmək
**fructose** ['frʌktous] *n kim.* fruktoza *(meyvə şirəsi)*
**fructuous** ['frʌktjuəs] *adj* 1. meyvə / bar verən, məhsuldar, bəhrəli; 2. məhsuldar, səmərəli, xeyirli, əlverişli
**fructuousness** ['frʌktjuəsnɪs] *n* 1. meyvə vermə qabiliyyəti, məhsuldarlıq; 2. səmərəlilik, xeyirlilik, əlverişlilik
**frugal** ['fru:gl] *adj* 1. qənaətcil, qənaətkar, ehtiyatlı, qənaətçi, qənaətli; ~ **housekeeper** qənaətcil evdar qadın; **to be ~ of** ***one's*** **time and money** vaxta və pula qənaət etmək; 2. kasıb, yoxsul, az, zəif, cüzi; ~ **dinner** kasıb / yoxsul nahar



**frugality** [fru:'gælɪtɪ] *n* 1. qənaətcillik, qənaətkarlıq, yığıcılıq, ehtiyatlılıq; 2. mötədillik, mülayimlik, sadəlik
**frugally** ['fru:gəlɪ] *adv* 1. qənaətlə; qənaətkarlıqla; 2. təvazölə, sadə, təvazökarlıqla
**frugivorous** [fru:'dʒɪvərəs] *adj zool.* meyvəyeyən
**fruit**[1] [fru:t] *n* 1. meyvə, bar, bəhər; ~ **of the earth** adi bəhər/bar/meyvə; **to bear** ~ meyvə /bar vermək; 2. *top i* meyvə; **green /ripe/ mellow/fragrant** ~ kal/yetişmiş/şirəli/sulu/ ətirli meyvə; **preserved/tinned** ~ konservləşdirilmiş meyvə; **dried** ~ quru meyvə; **candied** ~ şəkərlənmiş meyvə; **to grow** ~ meyvə ağacları yetişdirmək; **to live on** ~ ancaq meyvə ilə qidalanmaq; **to pick/to gather/to pluck** ~ meyvə yığmaq /dərmək; 3. *pl* səmərə, nəticə; **the ~s of** ***one's*** **labour** öz əməyinin / zəhmətinin səmərəsi; **the ~s of learning** təhsilin səmərəsi; **to reap the ~s of** ***smth.*** bir şeyin səmərəsini / bəhrəsini görmək
**fruit**[2] [fru:t] *adj* meyvə; ~ **salad** meyvə/ meyvədən hazırlanmış salat; ~ **season** meyvə mövsümü; ~ **juice** meyvə şirəsi/ suyu; ~ **trees** meyvə ağacları
**fruit**[3] [fru:t] *v* bar/meyvə gətirmək, bar vermək; *The apple trees have fruited well this year Alma ağacları bu ilə yaxşı bar gətirib*
**fruitarian** [fru:'teəriən] *n* ancaq meyvələrlə qidalanan adam
**fruit-bearing**[1] ['fru:t.beərɪŋ] *n* meyvə/ bar/ məhsul vermə
**fruit-bearing**[2] ['fru:t.beərɪŋ] *adj* meyvə/bar / məhsul verən
**fruit-bud** ['fru:tbʌd] *adj bot.* meyvə/bar verən tumurcuq
**fruit-cake** ['fru:tkeɪk] *n* şəkərli və qozlu keks
**fruiter** ['fru:təʳ] *n* 1. meyvə ağacı; **prolific** ~ çox məhsul verən / məhsuldar meyvə ağacı; 2. meyvə daşıyan gəmi; 3. bağçı, bağçılıq mütəxəssisi
**fruiterer** ['fru:tərəʳ] *n* 1. meyvə alverçisi; meyvə mağazası satıcısı; 2. *arx.* = **fruit-grower**
**fruit-farming** ['fru:t'fa:mɪŋ] *n* meyvəçilik
**fruitful** ['fru:tfl] *adj* 1. münbit, məhsuldar, bərəkətli; meyvə/bar verən, bəhrəli; ~ **soil** məhsuldar/münbit torpaq; ~ **tree** meyvə/bar verən ağac; ~ **rain** xeyirli / faydalı yağış; 2. barlı, məhsullu, meyvəli, çox bar verən; 3. səmərəli, xeyirli, əlverişli; ~ **plan** səmərəli/əlverişli plan
**fruitfully** ['fru:tfəlɪ] *adv* səmərəli, səmərəli surətdə/tərzdə; *He used his time fruitfully O, vaxtını səmərəli keçirdi*
**fruitfulness** ['fru:tfəlnɪs] *n* 1. münbitlik, məhsuldarlıq, bərəkət; 2. meyvə vermə qabiliyyəti; 3. səmərəlilik, xeyirlilik, əlverişlilik
**fruit-grower** ['fru:t.grouəʳ] *n* bağçı, bağçılıq mütəxəssisi, meyvəçi, meyvə yetişdirən
**fruit-growing** ['fru:t'grouɪŋ] *n* bağçılıq, bağçılıq təsərrüfatı, bağçılıq elmi, meyvəçilik
**fruit-kiln** ['fru:tkɪln] *n xüs.* meyvə qurudan *(maşın)*, meyvə qurudan peç
**fruit-knife** ['fru:tnaɪf] *n* meyvə bıçağı, meyvə üçün bıçaq
**fruitless** ['fru:tlɪs] *adj* 1. məhsul verməyən, barsız; ~ **tree** barsız/məhsul verməyən ağac; 2. faydasız, xeyirsiz, səmərəsiz, nahaq, hədər, əbəs; müvəffəqiyyətsiz, boş, nəticəsiz; ~ **regrets** faydasız peşmançılıq; ~ **efforts** səmərəsiz/ faydasız səylər; ~ **attempt** səmərəsiz təşəbbüs; 3. uğursuz, bəxtsiz, işi gətirməyən
**fruitlessly** ['fru:tlɪslɪ] *adv* səmərəsiz, faydasız, nəticəsiz; boş/əbəs/hədər/nahaq yerə
**fruit-picker** ['fru:t.pɪkəʳ] *n k.t.* meyvədərən *(alət)*
**fruit-press** ['fru:tpres] *n* meyvə şirəsi çıxarmaq üçün məngənə
**fruit-stalk** ['fru:tstɔ:k] *n bot.* bəndəm, saplaq *(meyvədə)*
**fruit-store** ['fru:tstɔ:ʳ] *n* meyvə anbarı
**fruit-sugar** ['fru:t.ʃugəʳ] *n kim.* fruktoza *(meyvə şirəsi)*, qlükoza *(üzüm şirəsi)*
**fruit-tree** ['fru:ttri:] *n* meyvə ağacı
**fruity** ['fru:tɪ] *adj* (-ier, -iest) 1. meyvəli, meyvə dadı/tamı verən; **a ~ wine** meyvə dadı/tamı verən şərab; *The medicine had a fruity taste Dərman meyvə dadırdı, Dərmanda meyvə dadı/tamı vardır*; 2. zəngin və dolğun; **a ~ laugh** zəngin və dolğun gülüş, şaqraq qəhqəhə
**frump**[1] [frʌmp] *n* 1. köhnə moda ilə və pis geyinmiş qadın; 2. *d.d.* deyingən qarı, qoca arvad; xəbərçi; sözgəzdirən, dedi-qoduçu qadın/qız; 3. *arx.* istehza, masqara, ələ salma, lağa qoyma, rişxənd; etinasızlıq, saymazlıq, laqeydlik
**frump**[2] [frʌmp] *v* 1. ələ salmaq, istehza/rişxənd etmək, lağa/masqaraya qoymaq; təhqir etmək, toxunmaq, alçaltmaq; 2. *arx.* acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək; pis əhval-ruhiyyəyə səbəb olmaq, pis əhval-ruhiyyə yaratmaq
**frumpish** ['frʌmpɪʃ] *adj* 1. köhnə moda ilə geyinmiş; köhnə modalı, modadan çıxmış, dəbdən düşmüş; *məc.* köhnə; pinti; ~ **dress** modadan çıxmış / köhnə modalı paltar; 2. deyingən, davakar, dalaşqan, cəncəl; ağzını xeyrə açmayan, xeyirdanışmaz, həmişə pisliyə danışan
**frumpy** ['frʌmpɪ] *adj* 1. pis/zövqsüz geyinən; 2. deyingən, davakar, dalaşqan, cəncəl; 3. dəbdən çıxmış/düşmüş; ~ **shoes** dəbdən düşmüş/çıxmış ayaqqabı
**frustrate** [frʌs'treɪt] *v* 1. pozmaq, xarab etmək;

dağıtmaq, müvəffəqiyyətsizliyə uğratmaq; riayət/əməl etməmək; **to ~ *smb.'s* efforts** bir kəsin təşəbbüsünü pozmaq; **to ~ plans** planları pozmaq; **to ~ a design** fikri/planı pozmaq, fikrə/plana pəl vurmaq; 2. mənasız/səmərəsiz/nəticəsiz etmək; heçə/boşa çıxartmaq; **to ~ *smb.'s* hopes** bir kəsin ümidlərini boşa/heçə çıxartmaq; 3. qalib gəlmək, qələbə çalmaq, üstün gəlmək, udmaq *(bir kəsi)*, məğlub / darmadağın etmək *(bir kəsi)*; **to ~ *one's* opponents** rəqiblərini məğlub/darmadağın etmək; **to be ~d by bad weather/by disease** pis havaya / xəstəliyə görə özünü yorğun / əzgin / üzgün hiss etmək

**frustrated** [frʌs'treɪtɪd] *adj* olmayan, baş tutmayan, pozulmuş, dağılmış; yox/məhv edilmiş, alt-üst edilmiş/olmuş, boşa çıxmış; **~ hopes** boşa çıxmış ümidlər

**frustration** [frʌs'treɪʃn] *n* 1. pozma, pozulma; xarab etmə / edilmə / olma; **the ~ of *smb.'s* plans** bir kəsin planlarının pozulması; 2. darmadağın etmə/edilmə, tar-mar etmə/edilmə; tar-mar; **the ~ of *one's* opponents** düşmənlərinin/rəqiblərinin darmadağın edilməsi; 3. puça/boşa çıxma, iflas etmə, iflasa uğrama; **the ~ of *one's* hopes** ümidlərin boşa çıxması; **the ~ of *one's* plans** planların iflasa uğraması; 4. ümidi kəsilmə/boşa çıxma, məyus olma, ümidsizlik; **a feeling of ~** ümidsizlik hissi

**frustrative** ['frʌstrətɪv] *adj* pozan, xarab edən, dağıdan; naümid edən, ümidini boşa çıxardan, məyus edən, həvəsdən salan, əlini soyudan

**frutex** ['fru:teks] *n bot.* kol, kolluq

**fry¹** [fraɪ] *n* 1. qızardılmış/qovrulmuş ət; qızartma, qovurma; 2. *d.d.* həyəcan, vəlvələ, çaxnaşma, təşviş, iztirab, narahatlıq, ehtiras, həvəs; **to be in a ~** həyəcana gəlmək, təşvişə düşmək, əsəbiləşmək, narahat olmaq, nigaran qalmaq, iztirab çəkmək;

◊ **to ~ in *one's* own grease** əməlinə görə cəzasını çəkmək

**fry²** [fraɪ] *v* 1. qızartmaq, qovurmaq; **to ~ fish and chips** balıq və xırda kəsilmiş kartof qızartmaq; 2. qızarmaq, qovrulmaq; 3. əziyyət/əzab/iztirab vermək, incitmək, üzmək *(ürəyi)*; 4. *arx.* dalğalanmaq, ləpələnmək, köpüklənmək *(dəniz haq.)*

**fryer** ['fraɪəʳ] *n* 1. *aşp.* qızartmaq üçün aparat; 2. *pl* qızartmaq üçün balıq/cücə/çolpa *və s.*; 3. *kino.* güclü işıqlandırıcı cihaz

**frying-pan** ['fraɪɪŋpæn] *n* qulplu tava;

◊ *Out of the frying-pan into the fire* ≅ *Yağışdan çıxıb, yağmura düşmək*

**fuddle¹** ['fʌdl] *n d.d.* 1. keflənmə, sərxoş / məst olma; sərxoşluq, məstlik; 2. içki məclisi; içki düşkünlüyü, içkiyə aludəlik; *He is on the fuddle Onun başı kefə qızışıb*; 3. spirtli içki

**fuddle²** [fʌdl] *v d.d.* 1. sərxoşluq / əyyaşlıq etmək; keflənənə qədər içmək; 2.: **to ~ oneself** doyunca içmək; keflənmək, sərxoş olmaq; 3. çaşdırmaq; aldatmaq, beynini zəhərləmək; məst / bihuş etmək

**fuddle-cap** ['fʌdlkæp] *n d.d.* = **fuddler**

**fuddler** ['fʌdləʳ] *n d.d.* içki düşkünü, əyyaş

**fuddy-duddy** ['fʌdɪ'dʌdɪ] *n amer. jarq.* 1. deyingən, daim donquldanan/mızı qadın / qız, tənqidbaz *(hər bir şeydə eyb axtaran, hər bir şeyi tənqid edən adam)*; 2. köhnə fikirli adam; mühafizəkar

**fuel¹** ['fjuəl] *n* yanacaq, duru yanacaq *(neft, benzin və s.)*; **liquid/solid ~** duru/bərk yanacaq; **~ consumption** yanacağın işlənməsi/sərf edilməsi; **~ ratio** qarışığın tərkibi *(daxili yanma mühərrikinin)*; **~ gauge** yanacağın işlənməsini ölçən/göstərən cihaz; benzinölçən;

◊ **to add fresh ~ to a quarrel** dalaşmanı/dalaşmaları qızışdırmaq; **to add ~ to the flame** daha da qızışdırmaq, altına od qoymaq

**fuel²** ['fjuəl] *adj* yanacaq; **~ pump** yanacaq nasosu; **~ tank** yanacaq bakı

**fuel³** [fjuəl] *v* 1. yanacaq tökmək; ehtiyat yanacaq götürmək; 2. yanacaq doldurmaq; yanacaq ilə təmin etmək; 3. *dən.* yanacaq qəbul etmək; yanacaq götürmək; **to ~ a ship** gəmiyə yanacaq tökmək; 4. *d.y.* təchiz/təmin etmək *(paltarla, ləvazimatla)*

**fug¹** [fʌg] *n d.d.* 1. bürkülü/isti/boğanaqlı/ boğuq /kəsif/ağır hava; 2. zibil, toz *(otağın küncündə, paltarın tikiş yerində)*

**fug²** [fʌg] *v d.d.* bürküdə oturmaq; **to ~ at home** dörd divar arasında oturmaq, oturaq həyat tərzi keçirmək

**fuggy** ['fʌgɪ] *adj d.d.* 1. boğanaq, bürkülü, isti, havası təzələnməmiş, tüstü ilə doldurulmuş *(otaq haq.)*; 2. oturaq həyat tərzi keçirən, evdən bayıra çıxmamağa meylli; təmiz havadan qorxan

**fugitive¹** ['fju:dʒɪtɪv] *n* 1. qaçaq, qaçqın; **a ~ from justice** ədalət məhkəməsindən qaçan şəxs; 2. qaçqın; sürgün/sürgün edilmiş adam; **a ~ from the invaded areas** düşmən tərəfindən işğal edilmiş ərazilərdən olan qaçqın; 3. *arx.* dezertir, fərari; **a ~ from a battle** döyüş meydanından qaçan fərari; 4. səyyah, yolçu; qərib; sərsəri, səfil, avara; 5. davamsız boya/boyaq /rəng

**fugitive²** ['fju:dʒɪtɪv] *adj* 1. qaçmış; **~ soldier** qaçmış əsgər; **~ debtor** qaçmış borclu; 2. ötəri, ötüb gedən/keçən; keçən, keçici; **~ idea** ötəri fikir; 3. davamsız, sabit olmayan; uçucu, uçan; **~ colours** davamsız rənglər; 4. səyahət edən, gəzib dolaşan, gəzən, heç yerdə qərar tutmayan, avara, sərsəri, köçəri, daim yerini dəyişən; **~ theatrical company** qastrola çıxan teatr; 5. *arx.* qovulmuş, sürgün edilmiş

**fulfil** [ful'fɪl] *v* 1. yerinə yetirmək, icra / ifa etmək, həyata keçirmək; **to ~ a promise** vədi yerinə yetirmək; **to ~ *one's* duties / obligations** öz vəzifəsini/öhdəliklərini yerinə yetirmək; *Desires/Hopes have been fulfilled Arzular / Ümidlər həyata keçib;* 2. uyğun/müvafiq/münasib olmaq, düz gəlmək; yerinə yetirmək; **to ~ conditions** şərtləri yerinə yetirmək; 3. qurtarmaq, bitirmək, tamamlamaq, başa çatdırmaq; **to ~ *one's* work by certain date** müəyyən vaxta qədər işini qurtarmaq/ başa çatdırmaq

**fulfilment** [ful'fɪlmənt] *n* 1. icra/əməl etmə, yerinə yetirmə; həyata keçirmə; **the ~ of a condition** şərtin yerinə yetirilməsi; **the ~ of *one's* desires** arzularının həyata keçməsi; 2. qurtarma, tamamlama, başa çatdırma

**full¹** [ful] *adj* 1. dolu, ağzınacan dolu; **~ glass /bottle** dolu stəkan /butulka/şüşə; **~ audience house** ağzınacan dolu tamaşa zalı; **~ stomach** dolu mədə/qarın; **eyes ~ of tears** yaşla dolu gözlər; 2. doldurulmuş, dolmuş; **~ to the brim/to overflowing** ağzınacan dolu/dolmuş; qədərindən/həddindən artıq doldurulmuş; aşdırılıb-daşdırılmış; **only half ~** yarım/yarıya qədər doldurulmuş; 3. tam, qısaldılmamış, gödəldilməmiş, əskildilməmiş, azaldılmamış; **~ load** tam yük; **~ name** tam ad; ad və soyad; **a person ~ of kindness** çox mərhəmətli/mehriban adam; 4. ətraflı, mükəmməl, müfəssəl, əsaslı, qəti; **~ details of a scheme / of a plan** planın müfəssəl şərhi / izahı; **a ~ treatment of a subject** mövzunun ətraflı şərhi/işıqlandırılması/izah edilməsi; **a ~ account of *smth.*** bir şey haqqında müfəssəl / ətraflı hesabat; 5. tam tərkibli, tam komplektləşdirilmiş; **~ orchestra** tam tərkibli orkestr; **~ jury** tam tərkibli məhkəmə iclasçıları; 6. bütöv, bütövlüyə çatmış, ən yüksək dərəcəyə / nöqtəyə çatmış; **~ moon** bədirlənmiş ay; **~ summer** yayın qızğın çağı; **at ~ speed** tam sürətlə; **in ~ vigour** inkişaf/tərəqqi/yüksəliş dövründə /vaxtında; 7. tam, bütöv, bölünməz, vahid; **~ hour** bütöv/fasiləsiz bir saat; **~ view** tam görünüş sahəsi; **~ day** bütün günü; **~ wine** tünd şərab; **~ milk** üzlü süd; **~ line** bütöv xətt; 8. bol / çox olan, zəngin; **rivers ~ of fish** balığı bol olan çaylar; **woods ~ of game** ov quşları bol olan meşələr; **a dictionary ~ of useful examples** faydalı misallarla zəngin lüğət; *His head is full of nonsense Onun başı cəfəngiyyatla doludur;* 9. bol, zəngin; **~ meal** zəngin yemək *(qidalı, tez doyuran)*; **very ~ harvest** bol məhsul; 10. dolğun, kök, koppuş, iri, cüssəli, canlı; yumru, yupyumru, dolu; **rather ~ in the face** girdəsifət, yumrusifət, sifətdən dolu; **~ figure** kök/canlı bədən; 11. enli, geniş; **~ skirt** enli yubka; 12. doyunca yemiş; **to eat till one is ~** doyunca/qarnı partlayınca yemək; **to the ~** tamamilə, tamam-kamal, büsbütün; **to enjoy *smth.* to the ~** bir şeydən doyunca ləzzət/zövq/həzz almaq;

◊ **~ powers** tam ixtiyar/səlahiyyət/vəkalət/hüquq; **~ brother/sister** doğma qardaş / bacı

**full²** [ful] *adv* 1. düz, dürüst, dümdüz, məhz, lap; **~ in the centre** lap mərkəzdə; *The ball hit him full on the head Top düz onun başına dəydi;* 2. çox, olduqca; **~ well** çox yaxşı; **~ soon** olduqca tez, lap tez

**full³** [ful] *v* 1. geniş biçmək/kəsmək *(paltarı)*; büzmə tikmək; **to ~ a sleeve** qolu geniş tikmək *(paltarda)*; 2. *şair.* bütövlüyə çatmaq, bədirlənmək *(ay haq.)*; 3. *arx.* yerinə yetirmək, başa çatdırmaq

**full age** ['ful'eɪdʒ] *n* həddi-büluğ; **to be of ~** həddi-büluğa çatmaq

**full-back** ['fulbæk] *n id.* müdafiəçi *(futbol və ya hokkey oyununda)*

**full-blood** ['fulblʌd] *adj* 1. doğma *(qardaş, bacı haq.)*; 2. cins, əsil, xalis; safqanlı

**full-blooded** ['fulblʌdɪd] *adj* 1. = **full-blood**; 2. cüssəli; qüvvətli, sağlam, gümrah

**full-bodied** ['ful'bɔdɪd] *adj* 1. dolğun, kök, koppuş; köklüyə meylli; 2. tünd *(şərab haq.)*

**full-breasted** ['ful'brestɪd] *adj* iridöşlü, dolğundöşlü, dikdöşlü, yekədöşlü

**full-brimmed** ['ful'brɪmd] *adj* ağzınacan dolu /dolmuş

**full-eyed** ['ful'aɪd] *adj* 1. irigözlü, yekəgözlü; 2. yaxşı görünən

**full-faced** ['ful'feɪst] *adj* girdəsifət, yumrusifət, fətirsifət

**full-fed** ['ful'fed] *adj* 1. kökəldilmiş, kök, piyli, piylənmiş, çox kök, tosqun; 2. yedizdirilmiş, yedirilib doydurulmuş

**full-grown** ['ful'groun] *adj* 1. böyümüş, yetişmiş, inkişaf etmiş; 2. böyük, yaşlı, böyümüş, yaşa dolmuş; yekə

**full-length¹** ['ful'leŋθ] *n* boyu bərabərində portret, bədənnüma şəkil

**full-length²** ['ful'leŋθ] *adj* 1. boyu bərabəri, bütün qamətilə; bədənnüma; **~ ball gown** bədənnüma bal paltarı; 2. *kino.* tammetrajlı

**full pay** ['ful'peɪ] *n* tam maaş; **to be on ~** tam maaşa işləmək

**full-stop** ['ful'stɔp] *n* nöqtə

**full-term** ['ful'tə:m] *adj:* **~ child** vaxtında doğulan uşaq

**full-time** ['ful'taɪm] *n* 1. tam iş günü; 2. *id.* tam oyun vaxtı

**full-timer** ['ful'taɪməʳ] *n* 1. bütün dərslərə gələn şagird; 2. bütün iş həftəsi işləyən fəhlə

**full-trailer** ['ful.treɪləʳ] *n* bağlama, qoşma; bağlanma, qoşulma; qoşulan araba *(avtomobilə)*

**full up** ['ful'ʌp] *adj* 1. ağzınacan dolu; 2. boğaza qədər tox / doymuş, həddən artıq doymuş *(bir şeydən)*

**fully** [ˈfulı] *adv* tamamilə, büsbütün; tam, lap, çox; qətiyyən, heç, mükəmməl surətdə; ~ **persuaded** tamamilə inandırılmış; ~ **justified** tamamilə təmizə çıxardılmış/bəraət qazandırılmış; *It was fully seven o'clock before we got home Biz evimizə saat yeddidən keçmiş gəlib çatdıq*

**fulminant**[1] [ˈfʌlmınənt] *n* göy gurultusu

**fulminant**[2] [ˈfʌlmınənt] *adj* **1.** ildırım sürətli, ani, cəld, çox iti; **2.** *tib.* tez inkişaf edən *(xəstəlik haq.)*; ~ **disease** tez inkişaf edən xəstəlik

**fulsome** [ˈfulsəm] *adj* **1.** qeyri-səmimi, səmimiyyətsiz, ikiüzlü; süni; şişirdilmiş, mübaliğə edilmiş, mübaliğəli; hədsiz, həddən artıq; ~ **flattery** qeyri-səmimi yaltaqlıq, yaltaqcasına tərif; ~ **praise / admiration** süni tərif / heyranlıq; **2.** çox pis, çirkin, iyrənc, mənfur; alçaq, əclaf, xəbis, pis; **3.** şəhvətli, ehtiraslı, həvəsli; şəhvətpərəst

**fulsomely** [ˈfulsəmlı] *adv* qeyri-səmimi/ mübaliğəli tərzdə, şişirdilmiş halda, süni surətdə

**fulvous** [ˈfʌlvəs] *adj* qırmızımtıl-sarı; qonur, sarımtıl

**fumade** [fjuːˈmeıd] *n* hisə verilmiş / hisdə qurudulmuş xırda balıq; hisə verilmiş/ hisdə qurudulmuş sardina *(siyənək fəsiləsindən xırda balıq)*

**fumble**[1] [ˈfʌmbl] *n* yöndəmsiz/ləng rəftar *(nə iləsə)*

**fumble**[2] [ˈfʌmbl] *v* **1.** əlləmək, əl ilə yoxlamaq, əl ilə yoxlayıb tapmaq; **to ~ in** *one's* **pocket** cibini eşələmək/əl ilə nəyi isə axtarmaq; **2.** kobudcasına/naqolay rəftar etmək/işlətmək; **3.** öfkələmək, əzişdirmək; oynatmaq *(əlində)*, dartışdırmaq; **to ~** *one's* **scarf** şərfi dartışdırmaq

**fumbler** [ˈfʌmbləʳ] *n* yöndəmsiz, bacarıqsız, kütbeyin *(adam)*

**fume**[1] [fjuːm] *n* **1.** tüstü; **factory ~s** fabrik tüstüsü; **~s of incense** ətirli maddələr tüstüsü; **2.** *pl* buxar *(sudan alınmayan)*; **~s of wine** çaxır buxarı; **3.** buxarlanma, buğlanma, buğ; **to send off ~s** buxarlanmaq, buxar buraxmaq; **4.** kəskin/çox güclü qoxu; **the ~s of new-mown hay** təzə biçilmiş ot qoxusu

**fume**[2] [fjuːm] *v* **1.** tüstü vermək, tüstülətmək, hislətmək, hisə vermək, hisdə qurutmaq; **2.** tüstülənmək, tüstü buraxmaq; buxarlanmaq, buğlanmaq, buğ olmaq; **3.** qatranlamaq *(palıdı)*; **4.** həyəcana gəlmək, təşvişə düşmək, əsəbiləşmək; narahat olmaq; **to fuss and ~** vurnuxmaq və həyəcana gəlmək; **to ~ over/about trifles** boş şeyin üstündə əsəbiləşmək; **to ~ because one is kept waiting** gözləməyə məcbur edilməyinə görə özündən çıxmaq/hiddətlənmək

**fumigate** [ˈfjuːmıgeıt] *v* **1.** tüstü vermək, tüstülənmək; buxarla təmizləmək, dezinfeksiya etmək; **to ~ rose-bushes** qızılgül kollarına tüstü vermək; **2.** öldürmək, qırmaq, məhv etmək *(həşəratı)*

**fumigator** [ˈfjuːmıgeıtəʳ] *n* **1.** tüstü vermək / tüstülənmək üçün aparat; **2.** dezinfektor *(dezinfeksiya mütəxəssisi)*, fumiqasiya edən *(bitkiləri zərərli buğ və ya qaz vasitəsilə dezinfeksiya edən)*

**fumy** [ˈfjuːmı] *adj* tüstülü, tüstü dolmuş; tüstü basmış; tüstü verən

**fun**[1] [fʌn] *n* **1.** şadlıq, şənlik, nəşə, əyləncə, oyuncaq; **figure of ~** istehza/masqara obyekti; **full of ~** çox məzəli/gülməli; **to be fond of ~** zarafat /şadlıq/şənlik həvəskarı olmaq; *It would be such fun Bu nə şənlik olardı; What fun! Nə məzəlidir!*; **to spoil the ~** şənliyə mane olmaq, zarafatı korlamaq/pozmaq; **to have ~** əylənmək, kef çəkmək; dilxoşluq etmək; vaxtı şən keçirmək; *He has a lot of fun in him O çox məzəlidir;* **to make ~ of** *smb.*, **to poke ~ at** *smb.* bir kəsi ələ salmaq, bir kəsi masqaraya/lağa qoymaq; **2.** zarafat obyekti; şənlik/ləzzət mənbəyi; *He is a great fun O, olduqca məzəlidir; The game was no fun Oyun heç/qətiyyən maraqlı deyildi; I don't see the fun of it Mən bunda gülməli/maraqlı heç nə görmürəm; Sailing a boat is a great fun Qayıqda gəzmək çox maraqlıdır/ləzzətlidir;*
◊ **for/in ~** zarafatla, zarafatyana, zarafat üçün; **like ~** cəld, iti, ildırım kimi, çox sürətlə; **~ and games** şənlik, şadlıq, nəşə; əyləncələr

**fun**[2] [fʌn] *v* zarafat etmək, zarafatlaşmaq, əylənmək, dilxoşluq etmək; gic-gic zarafat / şitlik etmək

**function**[1] [ˈfʌŋkʃn] *n* **1.** funksiya, vəzifə; rol, əhəmiyyət, iş; *The function of education is to develop the mind Təhsilin vəzifəsi əqli qabiliyyəti inkişaf etdirməkdir; Glass has an important function in modern architecture Müasir arxitekturada şüşə mühüm əhəmiyyət kəsb edir;* **2.** fəaliyyət; orqanizmin fəaliyyəti; **~s of the nerves** əsəb sisteminin fəaliyyəti; **regular ~s of the body** orqanizmin normal fəaliyyəti; **3.** *pl* xidməti vəzifələr / funksiyalar; xidmət sahələri; **to perform / to carry out** *one's* **daily ~s** gündəlik xidməti vəzifələrini yerinə yetirmək; **to exercise administrative ~s** inzibati vəzifələri yerinə yetirmək; **4.** təntənəli mərasim; şadyanalıq, şənlik; **to speak at a ~** təntənəli mərasimdə çıxış etmək; **to attend a great state ~** böyük dövlət şənliyində iştirak etmək; **5.** *d.d.* qəbul, gecə; **quite a small ~** xudmani bir axşam qonaqlığı/əyləncə gecəsi; **to see** *smb.* **at a public/social ~** bir kəsi ictimai qəbulda görmək

**function**[2] [ˈfʌŋkʃn] *v* **1.** işləmək, iş görmək, hərəkət etmək, fəaliyyət göstərmək; *The telephone was not functioning Telefon işləmirdi;* **2.** vəzifəni yerinə yetirmək; *The new official started functioning Yeni məmur vəzifəsini yerinə yetirməyə başladı*

**functional** [ˈfʌŋkʃənl] *adj* **1.** funksional; ~ **architecture** funksional memarlıq; ~ **disturbance**



*tib.* funksional pozulma; ~ **disease** funksional xəstəlik; ~ **heart-trouble** funksional ürək xəstəliyi; **2.** rəsmi; işgüzar

**functionary** [ˈfʌŋkʃnərı] *n* vəzifəli şəxs, məmur, hökumət qulluqçusu

**functionate** [ˈfʌŋkʃneıt] *v* işləmək; hərəkət etmək, iş görmək

**fund**[1] [fʌnd] *n* **1.** ehtiyat, *hərb.* ehtiyat hissəsi, fond *(pul vəsaiti)*; **a ~ for the victims of the flood** daşqının qurbanlarına yardım fondu; **guarantee ~** təminat fondu; **2.** fond *(pul vəsaiti)*, kapital; **the ~(s) of a bank** bankın fondu/kapitalı; **private ~(s)** şəxsi kapital/fond; **reserve ~** ehtiyat fondu/kapitalı; **sinking ~** amortizasiya fondu; **3.** *pl* fondlar, pul vəsaitləri; **to invest ~s** kapital qoymaq; **to be in ~s** yanında pulu olmaq; **to be out of ~s** (yanında) pulu olmamaq; **4.** (**the ~s**) *pl* qiymətli dövlət kağızları (*həm də* **the public ~s**); **to have money in the ~s** pulu dövlətin qiymətli kağızlarını almaqla saxlamaq; **5.** bitməz/tükənməz/qurtarmayan ehtiyat; mənbə; **a ~ of wisdom** elm dəryası *(zarafatyana)*

**fund**[2] [fʌnd] *v* **1.** *iqt.* birləşdirmək, möhkəmləndirmək, qüvvətləndirmək; **2.** qiymətli kağızlara kapital qoymaq; **3.** pul buraxmaq, pulla / vəsaitlə təmin etmək; **4.** ehtiyat üçün yığmaq

**fundament** [ˈfʌndəmənt] *n* dal, arxa, geri, sağrı, yan

**fundamental**[1] [ˌfʌndəˈmentl] *n* **1.** *pl* əsas qayda/qanun; prinsip; **2.** əsaslar; **the ~s of physics** fizikanın əsasları; **to differ on ~s** prinsipial məsələlərdə razılaşmamaq; **to agree upon ~s** əsas məsələlərdə razılaşmaq

**fundamental**[2] [ˌfʌndəˈmentl] *adj* **1.** əsas, əsaslı, köklü, başlıca; əhəmiyyətli, çox mühüm, zəruri, vacib; ~ **reason/cause** əsas səbəb; ~ **difference** əsas fərq; **a fact of ~ importance** ən mühüm fakt; ~ **research** əsaslı tədqiqat; ~ **change** əsas/köklü dəyişiklik; ~ **issue** əsas məsələ; ~ **human rights** əsas insan hüquqları; **to be ~ to progress** tərəqqinin vacib şərtləri olmaq; **2.** əsas; ~ **frequency** *fiz.* əsas/ xüsusi tezlik; ~ **units** əsas ölçü vahidləri; ~ **truth** *riyaz.* aksioma

**fund-holder** [ˈfʌndˌhouldəʳ] *n* faizli dövlət kağızlarının sahibi

**funeral**[1] [ˈfjuːnərəl] *n* dəfn; dəfn mərasimi; **quiet ~** sadə dəfn mərasimi; **to attend (at) a ~** dəfndə/dəfn mərasimində iştirak etmək; **to join the ~** dəfn mərasiminə qoşulmaq
◊ *It's not my funeral amer. Bu mənim işim deyil, Bu mənə aid deyil; It's your funeral amer. Bu sənin/sizin işindir/işinizdir*

**funeral**[2] [ˈfjuːnərəl] *adj* dəfn; matəm; ~ **speech** dəfn mərasimində söylənilən nitq; ~ **pyre/pile** dəfn tonqalı; ~ **urn** dəfn urnası *(yandırılmış meyitin külünü saxlamaq üçün vazaşəkilli qab)*; ~ **escort** *hərb.* son hərbi ehtiram göstərmək üçün hərbi dəstə

**funeral directors** [ˈfjuːnərəl dıˈrektəz] *n* dəfn mərasimi bürosu

**funereal** [ˈfjuːnıərıəl] *adj* **1.** matəm; ~ **garments** matəm paltarı; **2.** dəfn; qəmgin, tutqun, kədərli, dərdli; ~ **expression of face** üzün kədərli/dərdli ifadəsi

**funicular** [fjuˈnıkjuləʳ] *n* funikulyor *(kanatla işləyən dağ dəmir yolu)*

**funk**[1] [fʌŋk] *n d.d.* **1.** qorxu, vahimə, hürkü, diksinmə, dəhşət; **blue ~** çaxnaşma, vəlvələ, təlaş, qarışıqlıq, çaşıb qalma; **to be in ~** qorxmaq, çəkinmək, hürkmək, qorxuya düşmək; **to put** *smb.* **in/into a ~** bir kəsi bərk qorxutmaq/ hürkütmək, bir kəsi qorxuya/vahiməyə salmaq; **2.** qüssə, xiffət, məyusluq, qəm, kədər, hüzn; **3.** qorxaq, ağciyər *(adam)*

**funk**[2] [fʌŋk] *v d.d.* **1.** qorxmaq, çəkinmək; **to ~ pain/a scolding** ağrıdan/məzəmmətdən qorxmaq; **2.** qorxaqlıq göstərmək, çəkinmək; *He always funks when the pinch comes O həmişə həlledici dəqiqədə qorxaqlıq göstərir;* **3.** bir şeydən boyun qaçırmaq; qurtarmaq, xilas olmaq, yaxa qurtarmaq, canını qurtarmaq; başını /yaxasını çəkmək; **to ~ a difficulty/hard words** çətinlikdən / sərt sözlərdən yaxa qurtarmaq

**funky** [ˈfʌŋkı] *adj d.d.* **1.** bərk qorxudulmuş, hürküdülmüş, çaxnaşmaya/təlaşa/ vəlvələyə düşmüş; **2.** qorxaq, ağciyər

**funny**[1] [ˈfʌnı] *n* ikiavarlı / qoşaavarlı qayıq, yalik *(iki və ya dörd avarlı qayıq)*

**funny**[2] [ˈfʌnı] *adj* **1.** gülməli, məzəli, əyləncəli, qəribə, maraqlı; əyləndirici; **a ~ story** gülməli lətifə, qaravəlli, gülməli hadisə; *It's not funny at all Bu heç də gülməli deyil;* **2.** qəribə, təəccüblü, qeyri-adi, anlaşılmaz; ~ **temper/way to behave** qəribə xarakter/davranış; ~ **thing** anlaşılmaz /qəribə şey; **to feel/to go all ~ 1)** qeyri-adi həyəcan hiss etmək; **2)** kefsizlik hiss etmək; **3.** *d.d.* şübhəli, çirkli; ~ **business** çirkli iş, aldatma, yalan, hiylə, kələk, fırıldaq, dələduzluq; *There is something funny about it Burada nəsə bir fırıldaq var*

**funny house** [ˈfʌnıˈhaus] *n amer. d.d.* **1.** dəlixana; **2.** narkomanlar üçün xəstəxana

**funny-man** [ˈfʌnımən] *n* **1.** hazırcavab / məzəli adam, məzəli danışan adam, zarafatçı, masqaraçı; **2.** yumorist, yumoristik əsərlər yazan yazıçı, məzhəkəçi, komik

**funny paper** [ˈfʌnıˌpeıpəʳ] *n* **1.** yumor bölməsi *(qəzetdə)*; **2.** yumoristik qəzet

**fur**[1] [fəːʳ] *n* **1.** xəz, xəz paltar / palto; **sleek / smooth ~** sığallı xəz; **costly / valuable ~** baha qiymətli/bahalı xəz; **a dress trimmed with ~** xəz-

lə köbələnmiş paltar; 2. *pl* xəz malları, xəzlik dəri; xəz paltar / palto; **beaver/sable/silver-fox** ~ qunduz/ samur / qara-qonur tülkü xəzi; **a cargo of ~s** xəz mallarından ibarət yük; **to trade / to deal in ~s** xəz malları alveri etmək; **a fine collection of ~s** gözəl xəz malları/ məmulatı kolleksiyası; **wrapped in ~s** xəzə/xəz paltara bürünmüş; 3. xəzli heyvanlar; ~ **and feather** xəzli heyvan və quş; **to hunt** ~ xəzli heyvan ovu etmək; ~ **coat** xəzdən tikilmiş kürk; 4. yun, tük, yun iplik, yun parça; dəri; qabıq; 5. *tib.* ərp, irinlik, ləkə *(dildə)*; 6. ərp *(qazanda və s.)*; 7. tük *(meyvənin və s. üstündə)*

**fur²** [fə:ʳ] *adj* xəz, xəzdən tikilmiş; ~ **collar** xəz yaxalıq; ~ **coat** xəz kürk; ~ **lining** xəz astar

**fur³** [fə:ʳ] *v* 1. xəzlə bəzəmək, xəz astar vurmaq; 2. ərp bağlamaq; 3. ərpi təmizləmək *(qazandan və s.)*

**furbish** ['fə:bɪʃ] *v* təmizləmək *(pasdan)*, pardaqlamaq, hamarlamaq, cilalamaq; **to ~ armour** yaraq-əsləhəni *(qalxan, geyim və s.)* təmizləmək

**furbisher** ['fə:bɪʃəʳ] *n* pardaqçı, cilalayıcı; soyuq silaha bəzək vuran usta

**furfur** ['fə:fəʳ] *n* (*pl* -es [-ri:z]) kəpək *(başda)*

**furious** ['fjuərɪəs] *adj* 1. qəzəbli, qeyzli, azğın, quduz, hirslənmiş, özündən çıxmış; ~ **animal** quduz /azğın heyvan; **to be** ~ qəzəbli/qeyzli olmaq; 2. şiddətli, qızğın, bərk; ~ **stream** şiddətli sel / axın; ~ **wind** şiddətli külək; ~ **struggle** qızğın mübarizə; **at a ~ pace** bərk sürətlə

**furiously** ['fjuərɪəslɪ] *adv* qəzəblə, hirslə, qeyzlə, acıqlı, qeyzli, qəzəbli; hiddətlə; dəli kimi, quduzcasına, azğıncasına

**furiousness** ['fjuərɪəsnɪs] *n* qəzəb, acıq, qeyz; hiddət; hirs, özündən çıxma, azğınlıq

**furnace¹** ['fə:nɪs] *n* 1. peç, ocaq, soba *(texniki)*; vaqranka *(zavodlarda çuqun əritmək üçün peç)*; **high** ~ şaxta peçi; 2. qızdırma, qalama; 3. sınaq, imtahan; ağır sınaq; **tried in the** ~ ağır sınaqdan keçmiş

**furnace²** ['fə:nɪs] *v* 1. peçdə yandırmaq, bişirmək; 2. peçlərlə təchiz etmək

**furnish¹** ['fə:nɪʃ] *n d.d.* bəzəmə, bəzək vurma; bəzək, zinət, bəzək-düzək, yaraşıq, naxış

**furnish²** ['fə:nɪʃ] *v* 1. təchiz etmək, vermək; çatdırmaq, aparmaq; **to ~ a library with books** kitabxananı kitablarla təchiz etmək/komplektləşdirmək; **to ~ supplies** ərzaq/azuqə göndərmək, ərzaqla təchiz etmək; **to ~ *smb.* with information** bir kəsə xəbər / məlumat çatdırmaq; 2. *hərb.* **to ~ close support** bilavasitə kömək etmək; **to ~ resistance** müqavimət göstərmək; 3. düzəltmək, otağı səliqəyə salmaq, avadanlıq qoymaq, mebel düzmək; **to ~ a house/room tastefully/ well/ badly/ poorly** evə/otağa zövqlə/yaxşı/pis/ucuz mebel düzmək; 4. təqdim etmək; **to ~ proofs** sübutlar / dəlillər təqdim etmək

**furnished** ['fə:nɪʃt] *adj* mebel düzülmüş; ~ **rooms** mebel düzülmüş otaqlar;

◊ **a well ~ mind** hərtərəfli təhsil almış adam

**furnisher** ['fə:nɪʃəʳ] *n* tədarükçü *(mebel)*

**furniture** ['fə:nɪtʃəʳ] *n* mebel, avadanlıq; **cheap /costly /old-fashioned / polished** ~ ucuz/bahalı/köhnə modalı/pardaxlanmış mebel; **mahogany** ~ qırmızı ağacdan hazırlanmış mebel; **a piece of** ~ mebel dəsti; **to buy new** ~ təzə mebel almaq; **to deal in** ~ mebel alveri etmək

**furred** [fə:d] *adj* 1. bəzədilmiş, altından tikilmiş xəz; 2. xəzli *(heyvan haq.)*; 3. xəz geyən; xəzli palto geyən; 4. ərp bağlamış; ~ **tongue** ərp bağlamış dil; 5. ərplə örtülmüş *(qazan, çaynik və s. haq.)*

**furrier** ['fʌrɪəʳ] *n* xəzçi, xəz alverçisi

**furriery** ['fʌrɪərɪ] *n* 1. xəz alveri / ticarəti; 2. xəzçilik; 3. *arx.* xəz paltar / palto

**furry** ['fə:rɪ] *adj* 1. xəzdən tikilmiş; xəz astarlı, altından xəz tikilmiş; 2. xəzlə örtülmüş; xovlu, yumşaq, tüklü; ~ **animal** tüklü heyvan; 3. xəzə bənzər / oxşayan; **a sort of ~ moss** yumşaq / tüklü mamır; 4. ərp bağlamış, ərplə örtülmüş

**fur-seal** ['fə:si:l] *n zool.* dəniz pişiyi

**further¹** ['fə:ðəʳ] *adj* **far** *sifətinin müqayisə dərəcəsi*; 1. daha uzaq; **the ~end of the village** kəndin daha uzaq qurtaracağı; **on the ~ side of the river** çayın o biri/ daha uzaq tərəfində; 2. gələcək, sonrakı, sonra gələn/olan; ~ **improvement** sonrakı təkmilləşmə; ~ **education** sonrakı təhsil; 3. əlavə; **to obtain ~ information** əlavə məlumat almaq/əldə etmək; *There's nothing to be said further Əlavə deyiləsi bir şey yoxdur*

**further²** ['fə:ðəʳ] *adv* **far** *zərfinin müqayisə dərəcəsi*; 1. artıq, daha; *Unsafe to proceed further Artıq irəliləmək təhlükəlidir*; **to inquire** ~ sorğu-sualları davam etdirmək; 2. bundan başqa, bir də; sonra; *Let me further tell you İcazə ver / verin əlavə edim*

**further³** ['fə:ðəʳ] *v* kömək/yardım etmək; imkan yaratmaq; **to ~ plans** planları həyata keçirməyə kömək etmək; **to ~ hopes** ümidləri doğrultmağa imkan yaratmaq

**furtherance** ['fə:ðəms] *n* kömək, yardım, kömək/yardım etmə

**furthermore** ['fə:ðə'mɔ:ʳ] *adv* bundan başqa, əlavə, buna əlavə olaraq; *Furthermore, I want to add... Bundan başqa mən əlavə etmək istəyirəm...*

**furthest¹** ['fə:ðɪst] *adj* **far** *sifətinin üstünlük dərəcəsi* = **farthest¹**

**furthest²** ['fə:ðɪst] *adv* **far** *zərfinin üstünlük dərəcəsi* = **farthest²**



**furtive** ['fə:tɪv] *adj* 1. gizli, gizlin, üstüörtülü, görünməyən, seçilməyən, hiss edilməyən; nəzərə çarpmayan, ən adi; ~ **smile** azca sezilən təbəssüm; **to cast a ~ glance** oğrun-oğrun baxmaq; ~ **blow** gizlin vurulan zərbə; 2. yavaş, səssiz, xəlvəti; ~ **footsteps** yavaş addımlar; 3. hiyləgər; kələkbaz, fəndgir, bic; əliəyri

**furtively** ['fə:tɪvlɪ] *adv* gizlin, oğrun-oğrun, xəlvəti, gizlincə, heç kəsə bildirmədən

**furuncle** ['fjuərʌŋkl] *n tib.* çiban

**furunculous** [fju'rʌŋkjuləs] *adj* 1. çibanlı, çibanla örtülmüş; 2. çibandan əzab çəkən

**fury** ['fjuərɪ] *n* qəzəb, acıq, qeyz; hiddət; hirs, azğınlıq; **the ~ of an attack** həmlənin azğınlığı; **the ~ of the storm** boranın /tufanın azğınlığı; **to be in a ~** qəzəblənmək, qeyzlənmək; **to goad *smb.* into ~** bir kəsi qəzəbləndirmək / hiddətləndirmək; **to control *one's* ~** qəzəbini/acığını gizlətmək/boğmaq / cilovlamaq

**fuscous** ['fʌskəs] *adj* qaramtraq, qaramtıl, tünd, tutqun

**fuse¹** [fju:z] *n* 1. əritmə, əridilmə; 2. *el.* qoruyucu *(mexanizmlərdə)*, "probka" *(həm də ~* **plug**)

**fuse²** [fju:z] *v* 1. əritmək *(metalı)*; 2. ərimək *(metal haq.)*; əridib bitişdirmək *(iki metal parçasını)*; qaynaq etmək *(əritməklə)*; *The two metals fused Bu iki metal əriyib bitişdi*; 3. əritmək, həll etmək; ərimək, həll olmaq; 4. *d.d.* sönmək, keçmək *(işıq haq.)*

**fuselage** ['fju:zɪla:ʒ] *n av.* füzelyaj *(təyyarənin gövdəsi)*

**fusel-oil** ['fju:zl'ɔɪl] *n* təmizlənmiş yağ

**fusibility** [.fju:zə'bɪlɪtɪ] *n xüs.* əriyə bilmə, ərimə qabiliyyəti

**fusible** ['fju:zəbl] *adj* tezəriyən; ~ **alloy** tez-əriyən ərinti *(xəlitə, qatışıq)*; ~ **agent** *tex.* flüs, aşqar; ~ **welding** əritməklə qaynaq etmə

**fusile** ['fju:saɪl] *adj* 1. əriyən, əriyə / əridilə bilən; 2. əridilmiş *(metal və s.)*

**fusillade¹** [.fju:zɪ'leɪd] *n* 1. tüfəng atəşi; 2. güllələmə; gülləyə tutma; gülləbaran

**fusillade²** [.fju:zɪ'leɪd] *v* 1. atəşə/topa tutmaq, gülləyə basmaq/tutmaq; 2. güllələmək

**fusing** ['fju:zɪŋ] *n* 1. əritmə; ərimə; 2. yandırma, yandırılmış meşə yeri; 3. birləşmə, qovuşma

**fuss¹** [fʌs] *n* 1. əsəbi / həyəcanlı vəziyyət; **to get into a ~** həyəcanlanmaq, əsəbiləşmək; **in a state of ~** həyəcan/təşviş içində; 2. təlaş, tələsmə, vurnuxma, çapalama, boş-boşuna əlləşmə, qarışıqlıq, çaxnaşma, hərc-mərclik, əl-ayağa düşmə, hay-küy, mərəkə, vəlvələ; **to make a ~** hay-küy qaldırmaq, vurnuxmaq, boş-boşuna əlləşmək/çapalamaq/təşvişə düşmək/əsəbiləşmək; **to make a ~ of *smth.*** bir şey haqqında hay-küy qaldırmaq; **to kick up a ~** hay-küy/mərəkə qaldırmaq; 3. daim vurnuxan/tələşda olan/tələsən/əl-ayağa düşən adam; boş /əhəmiyyətsiz şey üçün həyəcan keçirən adam

**fuss²** [fʌs] *v* 1. boş / əhəmiyyətsiz şey üçün həyəcanlanmaq/təşvişə düşmək/əsəbiləşmək/narahat olmaq/vurnuxmaq/boş-boşuna əlləşmək /çalışmaq /tələsmək/çapalamaq; *She is always fussing O daim vurnuxur/boş-boşuna əlləşir/tələsir;* 2. bir kəsin həddən artıq qayğısına qalmaq, bir kəsə bütün diqqətini vermək; *Don't fuss over the children so much Uşaqların üstündə bu qədər əsmə/əsməyin;* 3. təngə gətirmək, zəhlə aparmaq, bezikdirmək, narahat etmək; incitmək, əziyyət vermək; *Don't fuss me Məni təngə gətirmə/ gətirməyin;* 4. *amer.* dalaşmaq, söyüşmək, küsüşmək

**fussily** ['fʌsɪlɪ] *adv d.d.* 1. boş-boşuna, təlaş içində, tələsə-tələsə, əsəbi surətdə/halda; həyəcanla, iztirabla; 2. yöndəmsiz, kobud/ yöndəmsiz bir surətdə

**fussiness** ['fʌsɪnɪs] *n* 1. boş-boşuna vurnuxma/əlləşmə/çalışma/tələskənlik/qərarsızlıq/əsəbilik; **to show ~** əsəbiləşmək, vurnuxmaq; boş-boşuna əlləşmək/çalışmaq/ tələsmək/çapalamaq; 2. həddən artıq yükləmə/ yüklənmə

**fuss-pot** ['fʌspɔt] *n d.d.* daim vurnuxan/əlləşən /tələsən/təlaşda olan/qərarsız/həyəcanlı/narahat adam

**fussy** ['fʌsɪ] *adj* 1. daim vurnuxan /əlləşən / tələsən/təlaşda olan, qərarsız, əsəbi; **to be ~** vurnuxmaq, boş-boşuna əlləşmək/ çalışmaq; **to be ~ over *one's* clothes/ food** paltarına/yeməyinə həddən artıq diqqət yetirmək; 2. həddindən artıq yüklənmiş *(detallarla, hissələrlə)*, kobud, yöndəmsiz; ~ **literary style** qəliz/təmtəraqlı ədəbi üslub

**fusty** ['fʌstɪ] *adj* 1. üfunətli; pis, boğuq, kəsif, ağır *(hava haq.)*; **a ~ room** üfunətli, boğuq havalı otaq; 2. köhnə, köhnə modalı, modadan çıxmış, dəbdən düşmüş; ~ **book** köhnə kitab

**futile** ['fju:taɪl] *adj* 1. faydasız, xeyirsiz, səmərəsiz, nahaq, hədər, əbəs, boş, mənasız, xeyirsiz; ~ **attempt** faydasız/səmərəsiz təşəbbüs; ~ **undertaking** xeyirsiz/mənasız/əbəs fikir; 2. əhəmiyyətsiz, cəfəng; dəyərsiz, səthi, yüngül; ~ **play/book** dəyərsiz pyes/kitab; ~ **person** boş adam

**futility** [fju:'tɪlɪtɪ] *n* 1. faydasızlıq, səmərəsizlik, xeyirsizlik; **the ~ of his efforts** onun səylərinin səmərəsizliyi; 2. mənasızlıq; qeyri-ciddilik; **the ~ of *smb.*'s life** bir kəsin həyatının mənasızlığı; 3. qeyri-ciddi / yüngül adam

**future¹** ['fju:tʃəʳ] *n* 1. gələcək; **for the ~** gələcək üçün; **in (the) ~** gələcəkdə; **to have a great ~** gözəl gələcəyi/perspektivi olmaq; **to have no ~** gələcəyi olmamaq; **to foretell the ~** gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildir-

mək; **to provide for the ~ of** ***one's*** **family** ailəsinin gələcəyini təmin etmək; **2.** *pl tic.* müəyyən müddətə alınan mallar; təcili kontraktlar/müqavilələr; **to deal in ~s** möhtəkirlik məqsədilə malları qabaqcadan alıb yığmaq

**future[2]** [ˈfju:tʃəʳ] *adj* gələcək, gələn, gözlənilən, qarşıdakı, yaxındakı; **~ events** gələcək hadisələr; **~ wife** adaxlı/nişanlı qız; **~ generation** gələcək nəsil

**futureless** [ˈfju:tʃəlɪs] *adj* gələcəyi olmayan, perspektivsiz

**futurelessness** [ˈfju:tʃəlɪsnɪs] *n* gələcəyi olmama, perspektivsizlik

**futurity** [ˈfju:ˈtjuərɪtɪ] *n* **1.** gələcək; **2.** *pl* gələcək hadisələr; **3.** *din.* axirətlik, axirət

**fuzz[1]** [fʌz] *n* **1.** tiftik, narın tük; **2.** yumşaq/qalın/gur saç

**fuzz[2]** [fʌz] *v* **1.** narın tük qatı ilə örtülmək; **2.** uçub getmək *(narın tük haq.)*

**fuzz-ball** [ˈfʌzbɔ:l] *n* yağış göbələyi

**fuzziness** [ˈfʌzɪnɪs] *n* **1.** xovluluq, tüklülük, yumşaqlıq; **2.** aydın/aşkar / bəlli olmama, qeyri-müəyyənlik, anlaşılmazlıq, qarışıqlıq, hərcmərclik; **3.** qıvrımlıq, buruqluq *(saç haq.)*

**fuzz-wig** [ˈfʌzwɪg] *n* burulmuş/buruq parik *(qoyma / süni saç)*

**fuzzy** [ˈfʌzɪ] *adj* **1.** xovlu, yumşaq tüklü; **2.** narın tüklə örtülmüş; **~ peach** narın tüklə örtülmüş şaftalı/hulu; **3.** aydın/aşkar olmayan, qeyri-müəyyən; **4.** *fot.* tutqun, aydın olmayan; **5.** qıvrım, buruq *(saç haq.)*

**fylfot** [ˈfɪlfɔt] *n* svastika *(faşist nişanı)*



# Gg

**G g** [ dʒi:] *n (pl* **Gs, g's** [dʒi:z]) **1.** ingilis əlifbasının 7-ci hərfi; **2.** *mus.* sol *(diatonik qammanın beşinci notu)*

**gab[1]** [gæb] *n* I *d.d* **1.** cəfəngiyyat, boşboğazlıq, boş danışıq/söhbət; *He has the gift of the gab O, dilli-dilavərdir, O, söz üçün məəttəl qalmır; Stop your gab! Yum ağzını!, Sus!/Susun!;* **2.** naqqallıq, çərənçilik, ağzıboşluq

**gab** [gæb] *n* II **1.** kərtik, nişan, çapıq, yarıq, çapma; **2.** *tex.* qarmaq, çəngəl, qənarə; **3.** deşik, dəlik, göz

**gab[2]** [gæb] *v* naqqallıq /boşboğazlıq etmək, çənə vurmaq

**gabardine[1]** [ˈgæbədi:n] *n* qabardin *(yun parça)*

**gabardine[2]** [ˈgæbədi:n] *adj* qabardin; **a ~ jacket** qabardin sürtük

**gabarit** [ˌga:ba:ˈri:] *n fr.* qabarit, görkəm, əndazə

**gabber** [ˈgæbəʳ] *n* boşboğaz, çoxdanışan, çərənçi

**gabble[1]** [ˈgæbl] *n* **1.** mırtıldama, donquldanma, burnunun altında danışma; **2.** qaqqıldama *(qaz haq.)*

**gabble[2]** [ˈgæbl] *v* **1.** mırtıldamaq, donquldanmaq, burnunun altında danışmaq; *The little girl gabbled her prayers and jumped into bed Balaca qız dualarını tələm-tələsik mızıldayaraq yatağına girdi;* **2.** qaqqıldamaq *(qaz haq.)*

**gabbling** [ˈgæblɪŋ] *n* **1.** qırıldatma; mırtıldama, donquldanma, burnunun altında danışma; *Listen to those foreigners gabbling away O əcnəbilərin qırıldatmalarına qulaq as/asın;* **2.** qaqqıldama *(qaz haq.)*

**gabby** [ˈgæbɪ] *adj d.d.* danışqan, çoxdanışan, naqqal

**gaberdine** [ˌgæbəˈdi:n] *n* **1.** = **gabardine; 2.** uzun, boş üst geyim, mantiya *(orta əsrlərdə yəhudilərin geydiyi üst geyim)*

**gable[1]** [geɪbl] *n mem.* **1.** fronton *(bina fasadının iki maili dam ilə məhdudlaşmış üçbucaq və ya pərgar şəklində olan yuxarı hissəsi);* **2.** damda at başı şəklində bəzək; **3.** *tex.* dirək, dayaq

**gable[2]** [geɪbl] *adj* qoşaçatılı, iki tərəfə maili *(dam haq.);* **a ~ roof** iki tərəfə maili dam; **a ~ window** maili pəncərə / baca

**gabled** [ˈgeɪbld] *adj* sivri, sivriuclu, şiştəpəli *(dam haq.)*; **a ~ house** şiştəpəli ev

**Gabriel** [ˈgeɪbrɪəl] *n din.* Cəbrayıl

**gaby** [ˈgeɪbɪ] *n* sadədil / sadəlövh / sarsaq adam

**gad[1]** [gæd] *n* **1.** tiyə, ağız; **2.** *tex.* qələm *(dəmir və daş yonmaq üçün);* **3.** paz, çiv

**gad[2]** [gæd] *v* veyllənmək, avara-avara/boş-boş gəzmək; *We've been gadding about town all day Biz bütün günü şəhərdə veyllənmişik*

**gad[3]** [gæd] *inter. hə?, hə da!, Yox əşi! (təəccüb bildirən nida)*

**gadabout** [ˈgædə.baut] *n* avara/sərsəri/səfil adam

**gadder** [ˈgædəʳ] *n* **1.** avara, sərsəri, səfil; **2.** *tex.* dəlmə maşını, deşikaçan maşın; perforator *(süxur qazmaq üçün mexaniki burğu)*

**gad-fly** [ˈgædflaɪ] *n zool.* mozalan, ovod, gikovun

**gadget** [ˈgædʒɪt] *n d.d.* **1.** qurğu, alət, ləvazimat; **a new ~ for opening tin cans** konserv qabını açmaq üçün yeni alət; **2.** oyun-oyuncaq, bəzək-düzək, bərbəzək

**gadoid** [ˈgædɔɪd] *n zool.* treska *(şimal dənizində yaşayan balıq)*

**Gael** [geɪl] *n* irland keltləri *(Qərbi Avropada yaşamış qədim xalqlar qrupu)*

**Gaelic[1]** [ˈgeɪlɪk] *n* kelt dili

**Gaelic[2]** [ˈgeɪlɪk] *adj* keltlərə məxsus

**gaff[1]** [gæf] *n* I *ovlanmış balığı sudan çıxarmaq üçün istifadə olunan qarmaq/çəngəl;*
◊ **to stand the ~** *amer. d.d.* dözümlülük göstərmək; şikayət etmədən bütün çətinliklərə dözmək; **to give** ***smb.*** **the ~** bir kəslə sərt rəftar etmək; bir kəsi çox kəskin tənqid etmək

**gaff** [gæf] *n* II cəfəngiyyat, boş söz/şey;
◊ **to blow the ~** sirri faş etmək; sui-qəsdin üstünü açmaq, sirr vermək/açmaq

**gaff** [gæf] *n* III *d.d.* ucuz teatr; myuzik-holl *(tamaşa və ya teatr salonu);* **penny ~** bir qəpiklik tamaşa

**gaff[2]** [gæf] *v* qarmaqla tutmaq

**gaffe** [gæf] *n* səhv, səhv iş, diqqətsizlik, səhv addım

**gaffer** [ˈgæfəʳ] *n d.d.* **1.** sinli kişi, kənd ahılı/qocası; baba, babacan *(müraciət forması);* **2.** desyatnik, briqadir *(baş fəhlə)*, onbaşı

**gag[1]** [gæg] *n tib.* **1.** ağızgenişləndirən *(diş həkiminin ağızı açıq saxlamaq üçün istifadə etdiyi alət)*; **2.** *teatr.* özündən uydurma, özündən qondarma *(tamaşa zamanı aktyorun özündən uydurduğu improvizasiya);* **3.** zarafat; **4.** tıxac, qapaq; **5.** yalan, uydurma; **6.** probka, mantar; **7.** *jarq.* müzakirənin kəsilməsi *(parlamentdə)*

**gag[2]** [gæg] *v* **1.** tıxaclamaq *(heyvanların dişləməsi yaxud adamın çığırmaması üçün onların ağzına nəsə tıxmaq);* **2.** *d.d.* ağzını açıb söz deməyə qoymamaq; **3.** *d.d.* aldatmaq; **4.** çəkiclə düzəltmək

**gaga** [ˈgæga:, ˈga:ga:] *adj sl.* sarsaq, səfeh, yelbeyin, qanmaz; **to go ~** səfehləmək, axmaqlamaq, gicləmək

**gage[1]** [geɪdʒ] *n* I **1.** girov; **in ~ of** ***smth.*** bir şey üçün girov; **to give on ~** girov qoymaq/vermək;

2. meydan oxuma; **to throw down a ~** meydan oxumaq, meydana/ duelə çağırmaq
**gage** [geɪdʒ] *n* II = **gauge**
**gage²** [geɪdʒ] *v* **1.** zamin olmaq; girov qoymaq; **2.** *d.d.* mərc etmək / gəlmək
**gaggle¹** ['gægl] *n* **1.** dəstə, qatar *(qaz, durna və s. haq.)*; **2.** qaz qaqqıltısı; **3.** çərənçi qız/zənən /arvad yığnağı
**gaggle²** ['gægl] *v* qaqqıldamaq, qığıldamaq
**gag-man** ['gægmən] *n* məzhəkə yazan *(radio, estrada üçün)*
**gaiety** ['geɪətɪ] *n* **1.** şadlıq, dilxoşluq, nəşə, şənlik; **2.** şuxluq, şux görünüş; **flags and bunting that added to the ~ of the scene** mənzərənin şux görünüşünü daha da artıran bayraqlar və şüarlar; **3.** *pl* şənlik mərasimi, şənlik, əyləncə; **the gaieties of the Christmas season** mövlud bayramı şənlikləri
**gaily** ['geɪlɪ] *adv* **1.** şən, sevinc içində, sevinclə; **2.** parlaq surətdə, açıq, aydın
**gain¹** [geɪn] *n* **1.** qazanc, mənfəət; **2.** *pl* gəlir; əməkhaqqı; uduş *(oyunda)*; **3.** artma, artım, qalxma; **4.** asan qazanc, zəhmətsiz gəlir; **the love of ~** tamahkarlıq, acgözlük, hərislik, mənfəətgüdmə;
◊ *ill-gotten gains never prosper* ≅ *Hayla gələn vayla gedər, Küləklə gələn küləklə gedər*
**gain²** [geɪn] *v* **1.** qazanmaq, əldə etmək; **to ~ one's living** dolanacaq əldə etmək/qazanmaq; **to ~ experience** təcrübə qazanmaq; **to ~ strength** güclənmək, güc toplamaq; **2.** faydalanmaq; **3.** udmaq, nail olmaq; **to ~ a prize** prizə/mükafata nail olmaq, priz qazanmaq; **to ~ ground** üstünlük əldə etmək, irəliləmək; **to ~ victory** qələbə qazanmaq/ əldə etmək; **to ~ time** vaxt qazanmaq; **4.** irəli olmaq/getmək, qabağa qaçmaq *(saat haq.)*; *This watch neither gains nor loses Bu saat nə qabağa qaçır, nə də geri qalır; The clock gains three minutes a day Bu saat gündə üç dəqiqə qabağa qaçır;* **5.** çatmaq, yetişmək, yaxınlaşmaq; **to ~ touch** rəqibə/ düşmənə yaxınlaşmaq; **to ~ the rear of the enemy** düşmənin arxasına keçmək; **to ~ on** 1) haqlamaq, çatmaq, yetişmək; 2) basmaq *(torpaq, dəniz, çay haq.)*; **to ~ over** öz tərəfinə çəkmək, inandırmaq;
◊ **to ~ the upper hand** qələbə qazanmaq / əldə etmək; **to ~ an advantage over** *smb.* bir kəs üzərində üstünlük əldə etmək
**gainful** ['geɪnfl] *adj* gəlirli, faydalı, əlverişli
**gainings** ['geɪnɪŋz] *n pl* **1.** əməkhaqqı, gəlir; **2.** uduş, udma, aparma *(oyunda)*; fayda, qazanc
**gainly** ['geɪnlɪ] *adj* **1.** gözəl, qəşəng, incə, məlahətli; **2.** ədəbli, nəzakətli
**gainsay** [geɪn'seɪ] *v (pt, pp* **gainsaid**) **1.** etiraz etmək, razılaşmamaq; **2.** inkar etmək
**gait** [geɪt] *n* **1.** yeriş; **an awkward ~** köntöy yeriş; **slouching ~** yöndəmsiz ağır yeriş; **to know/to recognize** *smb.* **by his ~** bir kəsi yerişindən tanımaq; **2.** *pl* atın yorğa yerişi; allyur, yortma; **3.** *amer.* sürət; **to maintain an even ~** sürəti sabit saxlamaq, sürəti eyni saxlamaq; **to be capable of a faster ~** sürəti daha da artırmağa qadir olmaq; **to drive at a slower ~** daha asta getmək / sürmək
**gaiter** ['geɪtəʳ] *n* qamaş/getr *(çəkmə boğazını əvəz edən qunc)*; **a pair of ~s** bir cüt qamaş
**gal** [gæl] *n d.d.* qız, cavan qadın
**gala¹** ['ga:lə, 'geɪlə] *n* təntənə, şənlik, şadyanalıq
**gala²** ['ga:lə, 'geɪlə] *adj* təntənəli, bayramsayağı, təmtəraqlı; **in a ~ dress** bayram libasında; **~ night** təntənəli bayram/gecə/ mərasim
**galactic** [gə'læktɪk] *adj astr.* qalaktika, qalaktikaya məxsus; **extra ~ systems** qalaktikadan kənarda olan ulduzlar sistemi
**galantine** ['gæləntɪ:n] *n* qalantin *(şirə gəzdirilmiş yemək)*
**galaxy** ['gæləksɪ] *n astr.* **1.** qalaktika, ağ yol, süd yolu, kəhkəşan; **2.** *məc.* pleyada *(bir dövrün, cərəyanın ən görkəmli xadimlər dəstəsi)*; **a ~ of talents** istedadlar pleyadası
**gale** [geɪl] *n* I fırtına, tufan, boran, 7-10 bal gücündə külək; **stiff / hard ~** güclü külək /tufan; **strong ~** güclü fırtına; *This tree was blown down in the gale Bu ağacı tufan yıxdı;* **a ~ of laughter** qəhqəhə səsi; **~ warning** *dən.* fırtına xəbərdarlığı
**gale** [geɪl] *n* II *bot.* ayıpəncəsi *(bitki)*
**gale** [geɪl] *n* III vaxt hesabilə verilən vergi-nin/rentanın ödənilməsi
**galeeny** [gə'li:nɪ] *n zool.* firəngtoyuğu
**galena** [gə'li:nə] *n* qurğuşun mədəni, qalenit *(qurğuşun filizi)*
**galimatias** [gælɪ'mætɪəs] *n fr.* cəfəngiyyat, boş söz, mənasız söz
**galipot** ['gælɪpɔt] *n* terpentin *(iynəyarpaqlı ağaclardan alınan qətranlı şirə)*
**gall¹** [gɔ:l] *n* I **1.** öd; **~-bladder** öd kisəsi; **~-stone** öd daşı; **2.** ətiacılıq, qanıacılıq, tündlük; **to dip** *one's* **pen in ~** *məc.* zəhərləmək, sancmaq, acılamaq; *They transfixed one another with pens dipped in gall Onlar bir-birini acı sözlərlə sancdılar;* **to vent** *one's* **~ on** *smb.* acığını kiminsə üstünə tökmək; **3.** həyasızlıq, sırtıqlıq, abırsızlıq; **to have the ~ to do** *smth.* bir şeyi etmək üçün həyasız olmaq;
◊ **~ and wormwood** iyrənc, mənfur bir şey; *It is gall and wormwood to me Bu mənim lap ödümü ağzıma gətirir/ürəyimi bulandırır*
**gall** [gɔ:l] *n* II sıyırıntı, yağır *(atlarda)*
**gall** [gɔ:l] *n* III *bot.* fır *(ağac xəstəliyi)*
**gall²** [gɔ:l] *v* **1.** siyirmək, yağır etmək *(dərini)*; **2.** qəlbinə toxunmaq; *It was galling to him to have to ask for a loan Borc üçün ağız açmağa məcbur olması onun heysiyyətinə toxunurdu*
**gallant¹** ['gælənt] *n* **1.** aristokrat, kübar, modabaz; **2.** nəzakətli kavaler; arvadbaz, qadın düşkünü; **3.** oynaş, aşiq



**gallant²** ['gælənt] *adj* **1.** cəsur, fədakar, qəhrəman; **a ~ soldier** cəsur əsgər; **2.** gözəl, qəşəng; **3.** nəcib, diqqətli; *He was very gallant at the ball O, rəqs gecəsində özünü çox nəcib/diqqətli aparırdı;* **4.** məhəbbət; **a ~ adventure** eşq/məhəbbət macərası; **5.** soliqəli, şux
**gallant³** ['gælənt] *v* **1.** müşayiət etmək *(qadını)*; **2.** pərəstişkarlıq etmək
**gallantry** ['gæləntrɪ] *n* **1.** cəsurluq, qəhrəmanlıq, fədakarlıq; **2.** lütfkarlıq; **3.** eşqbazlıq
**galleass** ['gælɪæs] *n* qalera *(qədimdə çoxavarlı və ya yelkənli gəmi)*
**galleon** ['gælɪən] *n* yelkənli ispan gəmisi
**gallery** ['gælərɪ] *n* **1.** qalereya *(koridor, şüşəbənd, eyvan)*; **2.** incəsənət qalereyası, sərgi salonu; **picture ~** şəkil qalereyası, şəkil sərgisi salonu; **3.** qalyorka *(teatrlarda yuxarı yarus)*, balkon; **4.** yuxarı yarusda/balkonda əyləşən tamaşaçılar; **to play to the ~** ucuz şöhrət axtarmaq; **5.** *dağ. məd.* ştrek, yeraltı yol *(mədənlərdə)*, lağım yolu, mədən dəhlizi; **~ for the press** mətbuat nümayəndələri üçün yer *(parlament binasında, senatda)*; **the press ~ of the House of Commons** İcmalar Palatasında mətbuat nümayəndələri üçün yer
**galley** ['gælɪ] *n* **1.** = **galleass**; **the ~s** icbari katorqa işi, məşəqqətli iş; *He was sent to the galleys O, icbari katorqa işinə məhkum edildi;* **2.** gəmi mətbəxi, kambuz; **3.** *mət.* verstatka *(mətbəədə əl ilə hərf düzmək üçün alət)*, nabor; **to read the ~ proof** qrankanı oxumaq; *She read the galley proof of her new novel O öz yeni romanının qrankasını oxudu*
**galley-proof** ['gælɪpru:f] *n* qranka
**galley-slave** ['gælɪsleɪv] *n* **1.** qul və ya məhkum olunmuş cani *(avarçəkən kimi icbari işə məhkum olunmuş şəxs)*; **2.** ağır işlə məşğul olan şəxs
**gall-fly** ['gɔ:lflaɪ] *n zool.* qozqıran *(quş)*
**Gallic** ['gælɪk] *adj* qall, fransız
**gallic** ['gælɪk] *adj kim.* qallium *(aztapılan kimyəvi elementə məxsus)*
**gallicism** ['gælɪsɪzəm] *n* qallisizm *(fransız tərzində bir şey demə)*
**galligaskins** [ˌgælɪ'gæskɪnz] *n* gen şalvar
**gallimaufry** [ˌgælɪ'mɔ:frɪ] *n* hər şey, nə desən, nə istəsən, cürbəcür şey, həftbecər
**gallinaceous** [ˌgælɪ'neɪʃəs] *adj zool.* **1.** toyuğabənzər; **2.** toyuq fəsiləsindən olan ev quşlarına məxsus
**gallinazo** [ˌgælɪ'na:zou] *n zool.* keçələkərkəs *(quş)*
**gallipot** ['gælɪpɔt] *n* aptek bankası
**gallivant** [ˌgælɪ'vænt] *v* **1.** veyllənmək, avara-avara gəzmək; *Where are you gallivanting off to now? İndi hara veyllənməyə gedirsən?;* **2.** eşqbazlıq etmək, mazaqlaşmaq, hənəkləşmək, dilxoşluq etmək; qır vermək, naz etmək, əzilib-büzülmək *(qadın haq.)*
**gall-nut** ['gɔ:l'nʌt] *n* = **gall** III
**Gallomaniac** [ˌgælə'meɪnɪæk] *n* qalloman, fransızpərəst
**gallon** ['gælən] *n* qallon *(İngiltərədə və ABŞ-da duru və axıcı şeylər üçün 4,5 litrə bərabər ölçü vahidi)*
**gallop¹** ['gæləp] *n* dördayaq/dördnala çapma *(at haq.)*; *He rode away at a gallop O, atı dördnala çaparaq uzaqlaşdı; Shall we go for a gallop? At çapmağa gedəkmi?* **at full ~** var gücü ilə çaparaq; **at the snail's ~** tısbağa addımı ilə/ağır addımla yerimə
**gallop²** ['gæləp] *v* **1.** dördnala çapmaq, dördnala sürmək *(atı)*; **to ~ a horse to death** atı çaparaq bağrını çatlatmaq; *He gallopped across the field O, atı tarlanın ortasından çaparaq getdi;* **2.** sürətlə irəliləmək; **3.** sürətlə/cəld iş görmək/oxumaq /danışmaq (*həm də* **~ through /over**); **to ~ through** *one's* **work** işini tez qurtarmaq
**galloper** ['gæləpəʳ] *n* **1.** çapar at; **2.** sürətlə irəliləyən adam; **3.** çapar, qasid, əmr aparan, buyruqçu *(tapşırıqları, əmrləri və s. icraçılara yetirmək üçün komandirin yanında xüsusi hərbi qulluqçu)*; **4.** *hərb.* yüngül səhra topu
**Gallophobe** ['gæləfoub] *n* qallofob *(fransızlara düşmən olan adam)*
**galloping** ['gæləpɪŋ] *adj* **1.** dördnala çapan/ qaçan; **2.** çox tez inkişaf edən *(xəstəlik haq.)*; **~ consumption** çox tez inkişaf edən vərəm
**galloway** ['gæləweɪ] *n* alçaq güclü at
**gallows¹** ['gælouz] *n pl (Ancaq təkdə işlənir)* **1.** dar ağacı; **2.** edam, ölüm cəzası; **to come to the ~** edam olunmaq; *He will come to the gallows O gec-tez dar ağacından asılacaq;* **to send** *smb.* **to the ~** bir kəsi edam olunmaqla ölümə məhkum etmək; **to ripe for the ~** edama layiq olmaq; **3.** qozla, şahnişin, eşşək *(inşaat işlərində işlədilən hündür skamya)*; **4.** *d.d.* aşırma, çiyinbağı;
◊ **to cheat the ~** öz əcəli ilə ölmək *(cani haq.)*
**gallows²** ['gælouz] *adj* edama layiq, cinayətkar, əxlaqsız; **~ look / air** cani sifəti, cani görünüşü/görkəmi
**gallows-bird** ['gælouzbə:d] *n d.d* yaramaz, əclaf, dar ağacından asılmağa layiq adam
**gallows-ripe** ['gælouzraɪp] *adj zaraf.* ≅ *Ölür dar ağacı üçün, Nə dar ağacından asılasıdır*
**gallows-tree** ['gælouztri:] *n* **gallows¹**
**gall-pipe** ['gɔ:lpaɪp] *n* öd yolu, öd kanalı
**galop¹** ['gæləp] *n* qalop *(qədim sıdırğı rəqs)*
**galop²** ['gæləp] *v* qalop rəqsi ifa etmək, sıdırğı rəqs etmək
**galore¹** [gə'lɔ:ʳ] *n* bolluq, çoxluq
**galore²** [gə'lɔ:ʳ] *adv* bolluca, çoxluca; *There is*

*fruit galore in the Crimea this summer Bu yay Krımda bolluca meyvə var*

**galosh** [gə'lɔʃ] *n* qaloş; **a pair of ~es** bir cüt qaloş

**galumph** [gə'lʌmf] *v* **1.** sevincdən atılıb düşmək; hoppanmaq; **2.** təkəbbürlə addımlamaq

**galvanic** [gæl'vænɪk] *adj fiz.* **1.** qalvanik; **2.** spazmatik; süni; **~ smile** süni təbəssüm

**galvanizm** ['gælvənɪzəm] *n fiz.* **1.** qalvanizm *(elektrik elementlərindən alınan aşağı gərginlikli cərəyan haqqında bəhs)*; **2.** *tib.* qalvanizasiya *(qalvanik cərəyanın müalicə məqsədilə tətbiqi)*

**galvanization** [gæl'vənaɪ'zeɪʃn] *n* = **galvanizm** *(2-ci mənada)*

**galvanize** ['gælvənaɪz] *v* **1.** qalvanizasiya etmək *(içərisindən qalvanik cərəyan keçirmək)*; sinkləmək, üzünə sink çəkmək; **2.** oyatmaq, oyandırmaq, həyəcanlandırmaq; **to ~ *smb.* into action** bir kəsi hərəkətə gətirmək

**galvanized-iron** ['gælvənaɪzd'aɪən] *n* sinklənmiş /üzünə sink çəkilmiş dəmir

**galvanometer** [ˌgælvə'nɔmɪtə^r] *n* qalvanometr *(qalvanik /zəif elektrik cərəyanını ölçmək üçün cihaz)*

**gambade** [gæm'beɪd] *n* = **gambado**

**gambado** [gæm'beɪdou] *n (pl* **-os, oes** [ouz] **1.** *id.* kurbet *(atın qabaq ayaqlarını yığaraq sıçraması)*; **2.** gözlənilməz hərəkət *(əsas. ədəbsiz)*

**gambit** ['gæmbɪt] *n şahm.* **1.** qambit *(şahmat oyunu başlanğıcında tez hücuma keçmək məqsədilə fiqur və ya piyadaların qəsdən uduzulması)*; **2.** *məc.* gələcəkdə üstünlük qazanmaq məqsədilə edilən güzəşt

**gamble**[1] ['gæmbl] *n* **1.** qumar *(oyun)*; **2.** xətərli iş

**gamble**[2] ['gæmbl] *v* **1.** qumar oynamaq; **to ~ away** qumarda uduzmaq; *He lost his money gambling at cards O, kart oyununda pullarını uduzdu; He has gambled away half his fortune O, qumarda varidatının yarısını uduzub;* **2.** möhtəkirlik etmək; **to ~ in the Stock Exchange** hərrac bazarında möhtəkirlik etmək; **3.: to ~ with** risk etmək, təhlükəli işə girişmək; **to ~ with *one's* future** öz gələcəyini təhlükə altına atmaq / qoymaq

**gambler** ['gæmblə^r] *n* **1.** qumarbaz, qumarbaz oyunçu; **2.** fırıldaqçı

**gambling** ['gæmblɪŋ] *n* qumar, qumar oyunu; **to be fond of ~** qumar həvəskarı olmaq

**gambling-den** ['gæmblɪŋden] *n* qumarxana

**gambling-house** ['gæmblɪŋhaus] *n* = **gambling-den**

**gamboge** [gæm'bu:ʒ] *n* qummiqut *(rəssamların işlətdikləri tünd sarı rəngli maddə)*

**gambol**[1] ['gæmbəl] *n* **1.** atılıb-düşmə, tullanma, sıçrayış *(quzu, uşaq və s. haq.)*; **2.** şənlənmə, şənlik

**gambol**[2] ['gæmbəl] *v* atılıb-düşmək, tullanmaq, sıçramaq *(quzu, uşaq və s.)*

**game**[1] [geɪm] *n* I **1.** oyun; **to play the ~** qayda ilə oynamaq; **2.** *məc.* alicənablıqla hərəkət etmək; **to play a good / poor ~** yaxşı/pis oyunçu olmaq; *He plays a good game at cards O, yaxşı kart oynayır;* **to be off *one's* ~** yaxşı formada olmamaq, pis oynamaq; **to have the ~ in *one's* hands** oyunu ələ almaq; **3.** *id.* oyun, partiya; **a ~ of tennis** bir partiya tennis; **a ~ of chess** bir partiya şahmat; **4.: ~s** *pl* yarış; idman oyunları; **5.** əyləncə, əylənmə; *What a game! Gör nə maraqlıdır!;* **6.** zarafat; **to have a ~ with *smb.*** bir kəsi ələ salmaq; **to make ~ of** sataşmaq, lağa/araya qoymaq; **to speak in ~** zarafatla demək; **7.** niyyət, plan; *I wish I knew what his game is Kaş onun niyyətinin nə olduğunu biləydim;* **8.** kələk, hiylə, biclik; *He was playing a deep game O, gizli bir oyun oynayırdı; You are having a game with me Sən/Siz mənə kələk gəlməyə çalışırsan/çalışırsınız; None of your games! Zarafatı burax! / buraxın!, Hoqqa çıxartma! / çıxartmayın!, Mənə kələk gələ bilməzsən! / bilməzsiniz!;*

◊ *The game is up! "Kart vuruldu!, Oyunu uduzdun!; Iş bitdi!; The game is not worth the candle* ≅ *Astarı üzündən bahadır, Zəhmətinə dəyməz; Two can play at that game Görək allah kimə verəcək; This game is yours Oyun sənin!/ sizin!, Sən / Siz uddun / uddunuz*

**game** [geɪm] *n* II **1.** quş, ov quşları; **fair ~** ovlanması yasaq edilməmiş ov quşları; *məc.* hücum obyekti; **big ~** böyük heyvanlar *(fil, pələng və şirlər)*; **2.** *məc.* arzu olunan qənimət; **3.** ov quşlarının əti

**game**[2] [geɪm] *adj* **1.** cəsur, mübariz, qızğın, həris; **to die ~** qəhrəman kimi ölmək; **2.** həvəslə razı olan; **to be ~ for anything** hər şeyə hazır olmaq; *Are you game for a 10 mile walk? 10 mil piyada getməyə hazırsanmı?/hazırsınızmı?; He is game for anything you may suggest Nə təklif etsən / etsəniz o məmnuniyyətlə etməyə razı olacaq;* **3.** şikəst edilmiş, eybəcər hala salınmış; iflic olmuş *(əl, qol və s.)*

**game**[3] [geɪm] *v* qumar oynamaq; **to ~ away** qumarda uduzmaq *(həm də yarışda)*

**game-act** ['geɪmækt] *n* ov qaydaları və ov müddəti haqqında parlament aktı/qanunu

**game-bag** ['geɪmbæg] *n* ov çantası

**game-bird** ['geɪmbə:d] *n* ov quşu

**game-certificate** ['geɪmsəˌtɪfɪkɪt] *n* = **game-licence**

**game-cock** ['geɪmkɔk] *n* döyüşən xoruz

**game-fish** ['geɪmfɪʃ] *n* ovlanmayan balıqlar

**gameful** ['geɪmful] *adj d.d.* **1.** şən, zarafatcıl; **2.** ov quşu ilə dolu

**gamekeeper** ['geɪmˌki:pə^r] *n* ov quşlarını və ov heyvanlarını qoruyan meşəbəyi

**game-law(s)** ['geɪmlɔ:(z)] *n ov heyvanlarının mühafizəsi və onların ovlanması qaydaları haqqında qanunlar*

**game-licence** ['geɪmˌlaɪsəns] *n ov heyvanlarının ovlanması və onların ticarəti ilə məşğul olmaq üçün icazə (sənəd)*



**game-pie** ['geɪmˌpaɪ] *n* ov ətindən hazırlanmış piroq

**game preserve** ['geɪmprɪ'zə:v] *n* ov qoruğu, qoruq yeri

**game-reserve** ['geɪmrɪ'zə:v] *n* qoruq, yasaqlıq

**games-master** ['geɪmzˌma:stə^r] *n* bədən tərbiyəsi/idman müəllimi

**games-mistress** ['geɪmzˌmɪstrɪs] *n* **1.** uşaq bağçası tərbiyəçisi; **2.** idman müəlliməsi, idman oyunları təşkilatçısı *(məktəbdə)*

**gamesome**['geɪmsəm] *adj* şən, şux, zarafatcıl

**gamester** ['geɪmstə^r] *n* kart oynayan, qumarbaz

**gamete** ['gæmi:t] *n biol.* cinsiyyət hüceyrəsi

**gaming-house** ['geɪmɪŋhaus] *n* qumarxana

**gaming-table** ['geɪmɪŋteɪbl] *n* qumar masası

**gamma** ['gæmə] *n* **1.** qamma *(yunan əlifbasının üçüncü hərfi)*; **2.** *zool.* sovka *(kənd təsərrüfatı bitkilərinə ziyan verən tırtıllı gecə kəpənəyi)*

**gamma rays** ['gæməˌreɪz] *n pl fiz.* qamma şüaları

**gammer** ['gæmə^r] *n d.d.* nənə; ana, anacan *(yaşlı qadınlara müraciət forması)*

**gammexane** [ˌgæm'eksein] *n* həşəratlara qarşı toz *(DDT tipli)*

**gammon**[1] ['gæmən] *n* I bud *(donuz budu)*, qaxac edilmiş bud

**gammon** [gæmən] *n* II yalan

**gammon**[2] ['gæmən] *v* I hisə vermək, hisdə qaxac etmək

**gammon** ['gæmən] *v* II aldatmaq, hiylə etmək, yalandan özünü ... göstərmək/vurmaq

**gammon**[3] ['gæmən] *int.* = **nonsense**

**gammoner** ['gæmənə^r] *n* cinayət/oğurluq yoldaşı, şərik *(qarət üçün hədəf seçilmiş şəxsin diqqətini yayındıran oğru)*

**gammoning** ['gæmənɪŋ] *n* donuz budunun hisə verilməsi/qaxac edilməsi/duzlanması

**gammy** ['gæmɪ] *adj* axsaq

**gamp** [gæmp] *n d.d.* böyük çətir, şəmsiyyə

**gamut** ['gæmət] *n mus.* **1.** qamma; **2.** səs diapazonu; **3.** tamlıq, bütövlük; **to run the whole ~ of suffering** əzab-əziyyəti tam hiss etmək; *She ran the whole gamut of suffering O, bütün əzablara dözdü*

**gander** ['gændə^r] *n* **1.** erkək qaz; **2.** *məc.* axmaq /sadəlövh adam; **3.** *sl.* evli adam; **4.** *amer. sl.* həyat yoldaşından ayrı yaşayan şəxs *(ər yaxud arvad)*;

◊ **to see how the ~ hops** hadisələrin sonrakı inkişafını gözləmək

**gang**[1] [gæŋ] *n* **1.** qrup, dəstə, partiya; **section ~** dəmiryol fəhlələrinin bir qrupu *(dəmiryol sahəsində)*; **a ~ of slaves** qulların bir qrupu; **black ~ 1)** ocaqçılar; **2)** kömür boşaldan fəhlə qrupu; **chain ~** qandallanmış və zəncirlə bir-birinə ilhaq edilmiş canilər; **2.** quldur dəstəsi; banda, dəstə, güruh; **~ of thieves** oğrular dəstəsi; **~ highwaymen** yolkəsən quldur dəstəsi; **press ~** qaragüruh qəzetçilər qrupu; **3.** mexanizm dəsti, alət dəsti; **4.** *d.d.* kampaniya, curluq, tanışlıq, yoldaşlıq; *Don't get mixed up with that gang; they spend too much time drinking and gambling Sən/ Siz o dəstəyə qoşulma/qoşulmayın; onlar əksər vaxtlarını sərxoşluq və qumarla keçirirlər*

**gang**[2] [gæŋ] *v* **1.** dəstə təşkil etmək; quldur dəstəsinə qoşulmaq; **2.: to ~ up** hücum etmək, üstünə düşmək; *They ganged up on/against me Onlar mənə hücum etdilər*

**gang-board** ['gæŋbɔ:d] *n* taxta körpü, gəzdirmə körpü *(gəmilərdə)*

**gang-cask** ['gæŋka:sk] *n dən.* içməli su çəlləyi

**gang-cultivator** ['gæŋ'kʌltɪveɪtə^r] *n k.t.* çoxcərgəli kultivator

**ganged** ['gændʒd] *adj tex.* eyni vaxtda birgə işləyən, cütləşdirilmiş *(mexanizm)*

**ganger** ['gæŋə^r] *n* I onbaşı, nəzarətçi

**ganger** ['gæŋə^r] *n* II **1.** piyada; **2.** sürətli at

**ganglia** ['gæŋglɪə] *n pl* = **ganglion**

**gangling** ['gæŋglɪŋ] *adj d.d.* caydaq; uzundıraz, yöndəmsiz

**ganglion** ['gæŋglɪən] *n (pl* **-lia**) **1.** *anat.* qanqlı, əsəb düyünü; oynaq kisəsində əmələ gələn şiş; **2.** *məc.* güc / fəaliyyət / maraq mərkəzi

**gang-plank** ['gæŋplæŋk] *n amer.* = **gang-board**

**gangrene**[1] ['gæŋgri:n] *n tib.* **1.** qanqrena *(bədənin bir yerində toxumaların çürüməsi)*; *Gangrene set in and his leg had to be amputated Qanqrena başladı və onun ayağı/qıçı kəsilməli oldu;* **2.** xərçəng *(ağac xəstəliyi)*

**gangrene**[2] ['gæŋgri:n] *v* qanqrenaya məruz qalmaq; qanqrena olmaq

**gangrenous** ['gæŋgrɪnəs] *adj* qanqrenalı, qanqrenaya tutulmuş

**gang-saw** ['gæŋsɔ:] *n* ağackəsən/ağacdoğrayan dəzgah

**gangsman** ['gæŋzmən] *n* = **ganger I**

**gangster** ['gæŋstə^r] *n* qanqster, bandit

**gangway**[1] ['gæŋweɪ] *n* **1.** taxta körpü *(gəmidə)*; **2.** uzununa körpü; **3.** icmalar palatasını/məclisini iki hissəyə ayıran keçid, cərgələrarası keçid; **members above the ~** məxsus olduqları partiyanın rəsmi siyasətilə bağlı olan nazirlər; nazirlər, sabiq nazirlər və sıravi parlament üzvləri; **4.** işlək körpü; **5.** ştrek, yeraltı yol *(mədənlərdə)*

**gangway**[2] ['gæŋweɪ] *inter. Yol ver!/verin! Yol!*

**gannet** ['gænɪt] *n zool.* qarabatdaq *(quş)*

**gantlet** ['gæntlət] *n* = **gauntlet**[2]

**gantry** ['gæntrɪ] *n* **1.** rama, qaldırıcı kranın portalı / niştağı; **2.** *d.y.* siqnal körpüsü; **3.** *rad.* radiolokasiya antennası

**gantry-crane** ['gæntrɪ'kreɪn] *n* portallı kran; estakada kranı

**gaol**[1] [dʒeɪl] *n* **1.** həbsxana, dustaqxana; **2.** həbsxana cəzası; **three years in ~** üç il həbs cəzası; *He was sent to gaol O, həbsxanaya göndərildi*

**gaol**[2] [dʒeɪl] *v* həbsxanaya salmaq

**gaoler** ['dʒeɪlə^r] *n* = **jailer / jailor**

**gaol-bird** ['dʒeılbə:d] *n* = **jail-bird**
**gap[1]** [gæp] *n* **1.** yarıq, deşik, dəlik; **to open /to rend /to cut /to clear a ~ in a hedge / in a fence / in a wall** çəpərdən / hasardan / divardan deşik / keçid açmaq; *The sheep got out of the field through a gap in the hedge Qoyunlar otlaq sahəsindəki çəpər deşiyindən çıxdılar;* **to see smth. through a ~ in the fence** bir şeyi hasarın deşiyindən görmək; **2.** ara, məsafə, "pəncərə" *(cədvəldə);* **3.** boş yer, aralıq, boşluq; **to fill up / to close / to stop the ~** boşluğu doldurmaq; **4.** fikir ayrılığı, ziddiyyət; *There is a wide gap between father and son Ata ilə oğul arasında böyük fikir ayrılığı var;* **5.** dağ keçidi/dərəsi; **6.** *hərb.* yarıb keçmə, yarma, yarılma; *We must see that there is no gap in our defences Biz baxmalıyıq ki, müdafiə xəttimizdə boşluq olmasın/ müdafiə xəttimiz yarılmasın;* **7.** *av.* üst-üstə qoşaqanadlı təyyarənin qanadları arasındakı məsafə; **8.** *tex.* ara, aralıq, boşluq;
◊ **to stand in the ~** əsas zərbəni öz üzərinə götürmək
**gap[2]** [gæp] *v* boşluğu doldurmaq
**gape[1]** [geıp] *n* **1.** əsnəmə; **2.** təəccüblü baxış/nəzər; **3.: the ~s** toyuq xəstəliyi *(əsnəmə tutmasından quşların ölməsi);* **4.** dəlik, deşik; **5.** əsnəmə tutması
**gape[2]** [geıp] *v* **1.** əsnəmək; **2.** ağzı açıq qalmaq, təəccüblənmək; **to stand gaping** heyranlıqla baxmaq, ağzı açıq qalmaq; *The country visitors were gaping at the neon lights Kənddən gələnlər neon lampalarına / işıqlarına heyranlıqla tamaşa edirdilər;* **to ~ at an amazing sight** son dərəcə gözəl mənzərəyə heyranlıqla baxmaq; **3.: to ~ after/for** ehtirasla istəmək; dəlicəsinə həsrətində olmaq
**gaper** ['geıpəʳ] *n* avara, veyl, mayınaq
**gape-seed** ['geıpsi:d] *n d.d.* boş-boşuna baxma, göz gəzdirmə;
◊ **to seek/to buy/to sow ~** bazar-dükanda boş-boşuna avaralanmaq, veyllənmək
**garage[1]** ['gæra:ʒ] *n* qaraj
**garage[2]** ['gæra:ʒ] *v* maşını qaraja qoymaq / salmaq
**Garand rifle** ['gærənd'raıfl] *n d.d. hərb.* yarımavtomat Qarand tüfəngi
**garb[1]** [ga:b] *n* **1.** geyim, libas, paltar; **in the ~ of a sailor** dənizçi libasında/paltarında; **2.** milli geyim
**garb[2]** [ga:b] *v* geyindirmək; *He was garbed in motley Ona alabəzək libas/paltar geyindirdilər; He garbed himself as a sailor O, matros kimi geyinmişdi*
**garbage[1]** ['ga:bıdʒ] *n* **1.** zibil, mətbəx tullantıları; **2.** maklatura; **literary ~** oxunaqlı, lakin bədii cəhətdən çox zəif əsər; **3.** içalat, iç
**garbage[2]** ['ga:bıdʒ] *adj* zibil, tullantı; **~ can /pail** zibil qabı/vedrəsi
**garbage-collector** ['ga:bıdʒkə.lektəʳ] *n* zibilçi, süpürgəçi
**garble[1]** ['ga:bl] *n* qəsdən təhrif etmə, saxtalaşdırma
**garble[2]** ['ga:bl] *v* qəsdən təhrif etmək, saxtalaşdırmaq; **to ~ the report of a speech** çıxışın mətnini qəsdən təhrif etmək; **to ~ evidence** şahid ifadəsini saxtalaşdırmaq
**garçon** [ga:r'sɔ:ŋ] *n fr.* qarson, restoranda xörəkpaylayan
**garden** ['ga:dn] *n* **1.** bağ; bağça; **hanging ~** asma bağ; **medical ~** dərman bitkiləri yetişdirmək üçün bağ; **nursery ~** şitillik, tinglik; **the ~ of England** İngiltərənin bağı/cənubu; **kitchen ~** bostan; **market ~** satış üçün meyvə, tərəvəz yetişdirilən bağ; *We have not much garden Bizim çox da böyük olmayan bir bağçamız var;* **2.** *pl* park; **botanical ~s** botanika bağı; **zoological ~s** zoologiya bağı, zoopark;
◊ **to lead *smb.* up the ~ path** bir kəsi tovlamaq / başdan çıxartmaq/aldatmaq
**garden-bed** ['ga:dnbed] *n* lək, kərdi; çiçək ləki / kərdisi
**garden-city** ['ga:dn.sıtı] *n* bağ-bağatlı şəhər
**gardener** ['ga:dnəʳ] *n* bağban, bostançı, bağçılıq mütəxəssisi
**garden-frame** ['ga:dnfreım] *n* istixana/parnik çərçivəsi
**garden-gate** ['ga:dngeıt] *n* bağ qapısı, kiçik qapı, dərbəçə *(hasarda, darvazada)*
**gardenia** [ga:'di:njə] *n bot.* **1.** qardeniya *(həmişəyaşıl bəzək bitkiləri);* **2.** jasmin
**gardening** ['ga:dnıŋ] *n* bağçılıq; **~ tools** bağçılıq alətləri
**garden-party** ['ga:dn.pa:tı] *n* bağ qonaqlığı
**garden-plot** ['ga:dnplɔt] *n* bağ üçün ayrılmış sahə
**garden-pruner** ['ga:dn.pru:nəʳ] *n* bağ/bağban qayçısı
**garden-stuff** ['ga:dnstʌf] *n* tərəvəz, göy-göyərti, pencər
**garden-truck** ['ga:dntrʌk] *n amer.* satış üçün yetişdirilən meyvə və tərəvəz; **to raise ~ for the market** satış üçün meyvə və tərəvəz yetişdirmək
**gargantuan** [ga:'gæntjuən] *adj* nəhəng, çox böyük; **a ~ appetite** böyük/çox bərk iştaha, canavar / qurd iştahası
**gargarize** ['ga:gəraız] *v arx.* qarqara etmək *(boğazı),* boğazı yaxalamaq
**garget** ['ga:gıt] *n bayt.* yelinin hovlanması, yelin hovu
**gargle[1]** ['ga:gl] *n* qarqara, boğazı yaxalama
**gargle[2]** ['ga:gl] *v* boğazı yaxalamaq, qarqara etmək
**gargoyle** ['ga:gɔıl] *n insan yaxud heyvan şəklində daş və ya metaldan hazırlanmış nov*
**garibaldi** [gærı'bɔ:ldı] *n* qadın və ya uşaq bluzası *(üst köynəyi)*
**garish** ['geərıʃ] *adj* **1.** çox şit, gəl-gəl deyən, zövqsüz; **~ clothes** çox şit / alabəzək paltar; **2.**



parıldayan, göz qamaşdıran/parlaq *(rəng, işıq və s.)*
**garland[1]** ['ga:lənd] *n* **1.** zəncirə, hörük; çiçək hörüyü, əklil, çələng, tac *(çiçəkdən hörülmüş)*
**garland[2]** ['ga:lənd] *v* zəncirə ilə bəzəmək; **to gain/to get/to win/to carry (away) /to go away with the ~** qələbə çalmaq, qalib olmaq, birincilik qazanmaq
**garlic** ['ga:lık] *n bot.* sarımsaq; **a clove of ~** bir diş sarımsaq
**garlicky** ['ga:lıkı] *adj* sarımsaqlı; sarımsaq iyi / tamı verən
**garment** ['ga:mənt] *n* **1.** geyim əşyası; **2.** *pl* paltar, libas, don; **the upper ~s** üst geyimləri /paltarları; **3.** *məc.* don, paltar, örtük; **the earth's ~ of green** yerin yaşıl örtüyü / donu; **the birch in its spring ~** bahar libaslı tozağacı
**garnet** ['ga:nıt] *n miner.* **1.** süleyman daşı, qranat *(qiymətli daş);* **2.** tünd qırmızı rəng
**garnish[1]** ['ga:nıʃ] *n* **1.** qarnir, aş qarası; xuruş; **2.** xörəyi bəzəmə, bəzək
**garnish[2]** ['ga:nıʃ] *v* **1.** bəzəmək *(xörəyi/yeməyi);* **to ~ fish with slices of lemon** limon falları ilə balıq xörəyini bəzəmək; **2.** xörəyə qarnir / aş qarası / xuruş əlavə etmək/qoymaq
**garnishee[1]** [.ga:nı'ʃi:] *n hüq.* borclu olan adamın pulunu saxlayan şəxs
**garnishee[2]** [.ga:nı'ʃi:] *v hüq.* borclu olan adamın üçüncü bir şəxsdə olan pulunun başını bağlamaq
**garniture** ['ga:nıtʃəʳ] *n* bəzək, ornament, naxış; işləmə, bəzək vurma, haşiyə
**garret** ['gærət] *n* **1.** çardaq, mansarda *(çatı altında çap tavanlı otaq);* **from cellar to ~** evin hər yerində/tərəfində; **2.** *d.d. kob.* kəllə, baş; **to be wrong in *one's* ~** ağlı yerində olmamaq, ağlı çatmamaq, başı / kəlləsi boş olmaq
**garrison[1]** ['gærısn] *n hərb.* **1.** qarnizon *(qalada və ya şəhərdə yerləşən qoşun hissəsi);* **to be in ~** qarnizonda xidmət etmək; **~ commander** qarnizon rəisi; **~ ration; 2.** *amer.* əmin-amanlıq dövründə əsgərlərə verilən ərzaq payı
**garrison[2]** ['gærısn] *v hərb.* **1.** qarnizon yerləşdirmək; **2.** ordu yeritmək; **3.** qarnizon xidmətinə təyin etmək / göndərmək
**garrison cap** ['gærısnkæp] *n* pilotka *(pilot papağı)*
**garrot** ['gærət] I *n zool.* güləyənquşu
**garrot** ['gærət] II *n tib.* hörmə, eşmə, burma, turna, jqut
**garrotte[1]** [gə'rɔt] *n* **1.** qarrota *(edam aləti),* dəmir xalta; **2.** qarrota vasitəsilə edam etmə; **3.** qarət məqsədilə boğub öldürmə; **to tip the ~** *jarq.* boğub qarət etmək
**garrotte[2]** [gə'rɔt] *v* **1.** dəmir xalta / qarrota vasitəsilə edam etmək; **2.** qarət məqsədilə boğub öldürmək
**garrulity** [gæ'ru:lıtı] *n* boşboğazlıq, naqqallıq, çərənçilik, ağzıboşluq
**garrulous** ['gæruləs] *adj* boşboğaz, naqqal, çərənçi, ağzıboş; **to be as ~ as a magpie** sağsağan kimi boşboğazlıq etmək, qəcələ /sağsağan kimi ötmək
**garter** ['ga:təʳ] *n* corabbağı, dizbağı; **the Garter** aşırmalı cəngavərlik ordeni
**garter-knee** ['ga:təni:] *n* sol diz
**gas[1]** [gæs] *n* **1.** qaz; *Air is a mixture of gases Hava qazların qarışığından ibarətdir; Hydrogen and oxygen are gases Hidrogen və oksigen qazdırlar;* **natural ~** təbii /doğal qaz; **noble ~** təsirsiz qaz; **2.: the ~** məişət qazı; **to turn the ~ on** qazı yandırmaq; **to turn the ~ off/out** qazı söndürmək; **to turn the ~ up** qazı çox açmaq; **to turn the ~ down** qazı azaltmaq; **to lay the ~** qaz çəkmək; **3.** *fiz.* qaz halında cisim; **4.** metan, mədən qazı; **5.** *hərb.* zəhərləyici qaz; **6.** *amer.* benzin, qazolin, yanacaq; **to step on the ~** qaz vermək, sürəti artırmaq; **7.** *məc.* güc vermək; bir qədər sıxışdırmaq *(təsir etmək);* **8.** *d.d.* cəfəngiyyat, boş söhbət; *That's all gas Bu, boş söhbətdir/cəfəngiyyatdır;* **9.** *tib.* yel, qaz, hava, osduraq; **~ chamber** qaz kamerası; **~ bomb** *hərb.* kimyəvi bomba; **~ attack** kimyəvi hücum; **~ warfare** *hərb.* kimyəvi silahlarla aparılan müharibə; **~ defence** kimyəvi silahlardan müdafiə; **~ signal** *hərb.* kimyəvi silahdan müdafiə üçün həyəcan siqnalı
**gas[2]** [gæs] *v* ( -ss-) **1.** *hərb.* qazla zəhərləmək; boğucu qaz buraxmaq; **2.** kimyəvi silahlarla hücum etmək; zəhərli maddələrlə yoluxdurmaq; **3.** qazla doldurmaq; **4.** *amer.* yanacaqla doldurmaq; **5.** *d.d.* boş-boş danışmaq, gopa basmaq; *Stop gassing! Gopa basma! / basmayın!*
**gas-alarm** ['gæsə'la:m] *n hərb.* kimyəvi hücum həyəcanı
**gas-alert** ['gæsə'lə:t] *n hərb.* **1.** = **gas-alarm**; **2.** kimyəvi hücuma hazır olma, "əleyhqazı gey" vəziyyətində olma
**gas-a-teria** [.gæsə'tıərıə] *n amer. d.d.* özünəxidmət yanacaq doldurma məntəqəsi
**gas-bag** ['gæsbæg] *n* **1.** *av.* qaz balonu; **2.** aerostat; **3.** *d.d.* naqqal, gəvəzə, boşboğaz
**gas-burner** ['gæs.bə:nəʳ] *n* = **gas-jet**
**gas-chamber** ['gæs'tʃeımbəʳ] *n* **1.** qaz kamerası; **2.** meyvələrin çürüməsinin qarşısını almaq üçün qazla doldurulmuş kamera
**gas-cooker** ['gæs.kukəʳ] *n* = **gas stove**
**gas-cutting** ['gæs.kʌtıŋ] *n tex.* avtogenlə kəsmə
**gas-defence** ['gæsdı'fens] *n* kimyəvi silahlardan müdafiə
**gaselier** [.gæsə'lıəʳ] *n* qaz lüstrü/qəndili/ çılçırağı
**gas-engine** ['gæs.endʒın] *n* qazla işləyən mühərrik/motor
**gas-field** ['gæsfi:ld] *n* təbii/doğal qaz yatağı
**gas-fire** ['gæs.faıəʳ] *n* = **gas stove**
**gas-fitter** ['gæs.fıtəʳ] *n* qaz çilingəri *(qaz kəməri çəkən işçi)*

**gas furnace** [ˈgæs.fə:nıs] *n* qaz sobası
**gash**[1] [gæʃ] *n* **1.** dərin yara/kəsik; **2.** *tex.* çərtmə, kəsik
**gash**[2] [gæʃ] *v* dərin yara açmaq
**gas-helmet** [ˈgæs.helmıt] *n* əleyhqaz şlemi
**gas-house** [ˈgæshaus] *n* = **gas works**
**gasification** [ˈgæsıfıˈkeıʃn] *n* **1.** qaz halına salma/hasil etmə; **2.** qazlaşdırma, qaz çəkmə
**gasify** [ˈgæsıfaı] *v* **1.** qaz halına salmaq; **2.** qazlaşdırmaq, qaz çəkmək
**gas-jet** [ˈgæsdʒet] *n* qaz odluğu *(lampada, qaz plitəsində və s.)*
**gas-lock** [ˈgæslɔk] *n tex.* qaz tıxacı
**gas-mask** [ˈgæsma:sk] *n* əleyhqaz
**gas-meter** [ˈgæs.mi:tə[r]] *n* qaz sayğacı
**gas-motor** [ˈgæs.moutə[r]] *n* = **gas-engine**
**gasolene** [ˈgæsəli:n] *n* **1.** qazolin; **2.** *amer.* benzin
**gasolene-engine** [ˈgæsəli:n.endʒın] *n* benzinlə işləyən mühərrik; karbüratorlu mühərrik
**gasolene-gauge** [ˈgæsəli:ngeıdʒ] *n* benzin sayğacı
**gasolene-station** [ˈgæsəli:n.steıʃn] *n amer.* benzindoldurma məntəqəsi; benzin kolonkası
**gasolene-tank** [ˈgæsəli:ntæŋk] *n* benzin bakı
**gasoline** [ˈgæsəli:n] *n* = **gasolene**
**gasp**[1] [ga:sp] *n* ağır nəfəs alma; boğulma; **to speak with ~s** boğula-boğula danışmaq; *He gave a gasp Heyrətdən onun ağzı açıq qaldı;*
◊ *one's* **last** ~ son nəfəs; **to breath** *one's* **last** ~ canı ağzından çıxmaq, ömrünü bağışlamaq, ölmək
**gasp**[2] [ga:sp] *v* **1.** güclə nəfəs almaq; təngnəfəs olmaq, tövşümək; **to ~ with exertion** gərginlikdən boğulmaq; **2.** boğula-boğula danışmaq; *He gasped out a few words O boğula-boğula bir neçə söz dedi;* **to ~ with rage** hirsindən boğulmaq; **to ~ for life** ölümlə mücadilə/ mübarizə etmək
**gas-pain** [ˈgæs.peın] *n* mədə boşluğunda toplanmış qazdan qarın ağrısı
**gasper** [ˈgæspə[r]] *n d.d.* ucuz siqaret/papiros
**gas-proof** [ˈgæspru:f] *adj* = **gas-tight**
**gasser** [ˈgæsə[r]] *n geol.* **1.** qaz quyusu; **2.** *d.d.* naqqal, boşboğaz
**gas-shell** [ˈgæsʃel] *n* kimyəvi mərmi
**gas-shelter** [ˈgæs.ʃeltə[r]] *n* qazdan qorunmaq üçün sığınacaq
**gas-station** [ˈgæs.steıʃn] *n* = **gasolene-station**
**gas-stove** [ˈgæsˈstouv] *n* qaz peçi / plitəsi
**gas-supply** [ˈgæssə.plaı] *n* qaz təminatı
**gassy** [ˈgæsı] *adj* **1.** qaz halında; qazla doldurulmuş; **2.** *mac.* danışqan
**gas-tight** [ˈgæstaıt] *adj* qazadavamlı; qaz buraxmayan
**gastric** [ˈgæstrık] *adj anat.* mədə, mədəyə məxsus; **~ crises** *tib.* mədə ağırlaşmaları; **~ juice** mədə şirəsi; **~ lavage** mədəni yuma; **~ ulcer** mədə yarası; **~ fever** mədə soyuqlaması
**gastritis** [gæsˈtraıtıs] *n (pl* **-ides***) tib.* qastrit
**gastroduodenal** [ˈgæstrou.dju:əˈdi:nl] *adj anat.* mədə və onikibarmaq bağırsağa məxsus
**gastroenteritis** [ˈgæstrou.entəˈraıtıs] *n tib.* qastroenterit
**gastrologer** [gæsˈtrɔlədʒə[r]] *n* = **gastrologist**
**gastrologist** [gæsˈtrɔlədʒıst] *n* **1.** mədə-bağırsaq xəstəliyi üzrə mütəxəssis/həkim; **2.** aşpaz; aşpazlıq mədəniyyətini öyrənən şəxs; **3.** zərif və ləziz yeməkləri sevən adam; qurman
**gastrology** [gæsˈtrɔlədʒı] *n* **1.** mədə xəstəlikləri haqqında elm; **2.** aşpazlıq elmi, aşpazlıq
**gastronome** [ˈgæstrənoum] *n* qurman, dadlı yeməklər sevən adam
**gastronomer** [gæsˈtrɔnəmə[r]] *n* = **gastronome**
**gastronomic** [.gæstrəˈnɔmık] *adj* qastronomiya
**gastronomist** [gæsˈtrɔnəmıst] *n* = **gastronome**
**gastronomy** [gæsˈtrɔnəmı] *n* qastronomiya *(zərif yeyinti məmulatları)*; kulinariya
**gas-warfare** [ˈgæs.wɔ:feə[r]] *n* kimyəvi silahlarla aparılan müharibə
**gas-works** [ˈgæswə:ks] *n* qaz zavodu
**gat** [gæt] *n amer. d.d.* revolver, tapança
**gate**[1] [geıt] *n* **1.** alaqapı, darvaza; *He opened the garden gate and went into the street O, bağın darvazasını açdı və küçəyə çıxdı; He jumped over the gate into the field O, darvazanın üstündən çölə tullandı;* **2.** *məc.* giriş; çıxış; **the ~s of heaven/ paradise** haqqın dərgahı; cənnət qapıları; **3.** zastava; şlaqbaum; **4.** dağ keçidi; **5.** sürgü, sipər; **6.** şlyuz qapı; **7.** = **gate money**; **8.** tamaşaçıların sayı *(stadionda);* **9. ~s** *pl* kollec qapılarının bağlandığı axşam saatları *(Oksford və Kembric Universitetlərində);*
◊ **to crash the ~** biletsiz keçmək *(teatra, kinoya, idman yarışlarına və s.);* dəvətsiz gəlmək, çağırılmamış qonaq olmaq; **to get the ~ 1)** işdən çıxarılmaq / qovulmaq; **2)** aldanmaq *(nişanlı, adaxlı, oğlan haq.)*; **to give** *smb.* **the ~** bir kəsi işdən çıxarmaq/ qovmaq
**gate**[2] [geıt] *v* tələbələri kollec sahəsindən kənara buraxmamaq *(Oksford və Kembric Universitetlərində)*
**gate-bill** [ˈgeıtbıl] *n* **1.** *müəyyən olunmuş vaxtdan gec kolleca qayıdan tələbələrin cərimə olunması üçün qeydiyyat (Oksford və Kembricdə);* **2.** müəyyən olunmuş vaxtdan gec qayıdan tələbələr üçün cərimə *(Oksford və Kembric universitetlərində)*
**gate-circuit** [ˈgeıt.sə:kıt] *n el.* selektor sxemi
**gate-crash** [ˈgeıtkræʃ] *v* **1.** dəvətsiz gəlmək; **2.** biletsiz keçmək *(idman yarışlarına, hər hansı bir tədbirə və s.)*
**gate-crasher** [ˈgeıtkræʃə[r]] *n* **1.** çağırılmamış qonaq; **2.** biletsiz tamaşaçı
**gatehouse** [ˈgeıthaus] *n* **1.** gözətçi budkası *(qapının ağzında);* **2.** *şlyuz və hidravlik qurğular idarəsinin binası*
**gatekeeper** [ˈgeıt.ki:pə[r]] *n* qapıçı, gözətçi
**gate-legged** [ˈgeıtlegd] *adj* qıçları və üstü açılan *(masa və s.)*



**gate-money** [ˈgeıt.mʌnı] *n* giriş haqqı *(stadiona və s.)*
**gate-post** [ˈgeıtpoust] *n* alaqapı dirəyi;
◊ **between you and me and the ~** öz aramızda qalsın; nə dil bilsin, nə dodaq
**gate-way** [ˈgeıtweı] *n* **1.** alaqapı; **2.** giriş; çıxış
**gather** [ˈgæðə[r]] *v* **1.** toplamaq; *He soon gathered a crowd round him O tez bir zamanda ətrafına xeyli adam topladı;* **2.** toplaşmaq; *A crowd soon gathered round him Tez bir zamanda onun ətrafına xeyli adam toplaşdı; The clouds are gathering; it's going to rain Buludlar toplaşır, yağış yağacaq;* **3.** dərmək *(gülü);* toplamaq /yığmaq *(məhsulu, meyvəni və s.); The bee gathers honey Arı bal toplayır;* **4.** götürmək, yığmaq, qaldırmaq *(yerdən, sahədən və s.);* **to ~ pieces of a broken dish** sınmış boşqabın qırıqlarını yığmaq; **5.** əldə etmək, qazanmaq, yavaş-yavaş toplamaq; **to ~ experience** təcrübə qazanmaq/ toplamaq; **to ~ strength** güc toplamaq; **to ~ information** məlumat toplamaq; **6.** artırmaq *(sürəti); The train gathered speed as it left the station Qatar vağzalı tərk edən kimi sürəti artırdı;* **7.** qırışdırmaq *(alnı);* qırçınlamaq *(paltarı, donu);* **a shirt ~ed at the waist** qurşaq hissədə qırçınlaşdırılmış köynək; **8.** irinləmək *(çiban haq.);* **to ~ head** irinləmək, yetişmək *(çiban);* **9.** başa düşmək, nəticəyə gəlmək, anlamaq; *What did you gather from his statement? Sən/ Siz onun dediyindən nə anladın? / anladınız?;* **to ~ in** yığışdırmaq, çəkmək; **to ~ in** *one's* **stomach** qarnını çəkmək /yığmaq; **to ~ on** qovub çatmaq/ yetişmək *(gəmi haq.);* **to ~ up** toplamaq, yığışdırmaq *(yerdən, sahədən və s.);*
◊ **to ~** *one's* **breath** nəfəsini dərmək; **to ~ oneself (together) 1)** gücünü toplamaq; **2)** özünü ələ almaq; **to ~** *one's* **wits** fikrini cəm etmək; **to ~ heart** ürəklənmək; **to ~ the ball** *id.* topu ələ keçirmək; **to be ~ed to** *one's* **fathers / people** dünyasını dəyişmək, ölmək, haqq dünyasına qovuşmaq
**gathering** [ˈgæðərıŋ] *n* **1.** toplama, yığma; **2.** komplektləşdirmə; **3.** yığıncaq, iclas, görüş; **4.** *k.t.* toplama, yığım *(ot, taxıl və s.);* **5.** yığım mövsümü; **6.** *tib.* irinləmə, irinlik
**gathering-cry** [ˈgæðərıŋkraı] *n* çağırış, hay, car *(ordunu cəm etmək üçün)*
**gaud** [gɔ:d] *n* **1.** zövqsüz bəzək; zahiri bəzək, bərbəzək; **2.** oyuncaq; bəzək-düzək; oyun-oyuncaq
**gaudy**[1] [ˈgɔ:dı] *n* **1.** təmtəraqlı şənlik; **2.** hər il sabiq tələbələrin şərəfinə verilən nahar *(İngiltərə kolleclərində)*
**gaudy**[2] [ˈgɔ:dı] *adj* **1.** şit, zövqsüz, parlaq; **2.** alabəzək, qeyri-adi *(stil, üslub haq.)*; **a ~ dress** şit/qeyri-adi geyim; **(as) ~ as a peacock** geyinib-kecinmiş, bəzənib-düzənmiş *(tovuz quşu kimi)*, şıq geyinmiş
**gaudy-day** [ˈgɔ:dıdeı] *n* = **gaudy**[1]
**gauge**[1] [ˈgeıdʒ] *amer* **gage** *n* **1.** ölçü, əndazə, miqyas, kalibr *(silah lüləsinin diametrinin ölçüsü; əşyaların böyük-kiçikliyini müəyyən etmək üçün ölçü);* **to take the ~ of** ölçmək, müəyyən etmək, qiymətləndirmək; **2.** kriteri, meyar *(bir şeyə qiymət vermək üçün əsas götürülən əlamət, ölçü);* **3.** ölçü aləti, indikator; manometr; **4.** ülgü, qəlib, şablon, basmaqəlib, lekal *(əyri xətlər çəkmək üçün xətkeş və ya şablon)*, etalon, əyar; **5.** məftilin nömrəsi/ qalınlığı; **6.** *d.y.* dəmiryol relsləri arasındakı məsafə; **broad/ narrow/standard ~** gen /dar/ standart relslər; **7.** *dən.* küləyə görə vəziyyət;
◊ **to have / to keep the weather ~ of** üstünlüyə malik olmaq
**gauge**[2] [geıdʒ] *v* **1.** ölçmək, yoxlamaq *(ölçüsünü);* **2.** müəyyən etmək, qiymətləndirmək *(insanı, onun xarakterini);* **to ~** *smb.'s* **strength** bir kəsin gücünü müəyyən etmək; **3.** kalibrləmək, kalibrini ölçmək, yoxlamaq; **4.** yoxlayıb düzəltmək; **5.** damğa vurmaq *(çəki daşlarına)*, müəyyən bir ölçüyə salmaq, etalonlaşdırmaq
**gaugeable** [ˈgeıdʒəbl] *adj* ölçüyə gələn, ölçülə bilən
**gauge-board** [ˈgeıdʒbɔ:d] *n* **1.** ölçü cihazları yerləşdirilmiş panel; **2.** *avt.* cihazlar şiti / lövhəsi
**gauge-cock** [ˈgeıdʒkɔk] *n yanacağın və ya yağın səviyyəsini yoxlamaq üçün kran / lülək (avtomobillərdə və s.)*
**gauge-glass** [ˈgeıdʒgla:s] *n* suölçən şüşə boru; suölçən boru
**gauging-station** [ˈgeıdʒıŋ.steıʃn] *n* hidrometriya stansiyası
**gaunt** [ˈgɔ:nt] *adj* **1.** arıq, sısqa; **2.** uzun; **3.** qaşqabaqlı, mızı, nifrət oyandıran, tutqun
**gauntlet** [ˈgɔ:ntlıt] *n* I **1.** təkbarmaq əlcək, əllik *(sürücülər üçün);* **2.** dəmir / zirehli əlcək;
◊ **to throw/to fling down the ~** meydan oxumaq, duelə/meydana çağırmaq; **to pick/to take up the ~** təkbətək vuruşu / döyüşü qəbul etmək, meydana girmək
**gauntlet** [ˈgɔ:ntlıt] *n* II *təqsiri olan əsgəri iki əsgər sırası arasından keçirərək tənbeh etməkdən ibarət cəza üsulu (çar ordusunda və s.);* **to run the ~ of criticism** ciddi / kəskin tənqidə məruz qalmaq
**gauss** [gaus] *n fiz.* qauss *(maqnit sahəsinin intensivlik vahidi)*
**gauze** [gɔ:z] *n* **1.** tənzif, cuna; **2.** qaz-qaz *(nazik ipək parça)*, kisəyi *(nazik şəffaf parça)*; **3.** zəif duman; **4.** metal tor/parça; **~ pack / plug** tənzif tampon / tıxac, piltə *(yaraya qoymaq üçün)*
**gauze-swab** [ˈgɔ:zswɔb] *n* dəyirmi tənzif tampon
**gauzy** [ˈgɔ:zı] *adj* nazik, işıqkeçirən *(parça)*
**gave** [geıv] **give** *felinin k.z. forması*

**gavel** ['gævl] *n* çəkic *(iclas sədrinin, məhkəmənin, hərracbaşının istifadə etdiyi)*
**gavelkind** ['gævlkaınd] *n hüq. vəsiyyətnamə olmadıqda mərhumun torpaq mülkünün oğullar və ya qardaşlar arasında bərabər paylara bölünməsi*
**gavotte** [gə'vɔt] *n* qavot *(qədim fransız rəqsi və bu rəqs üçün yazılmış musiqi əsəri)*
**gawk**[1] [gɔ:k] *n* maymaq/ sarsaq /gic adam
**gawk**[2] [gɔ:k] *v* gözlərini bərəltmək; ağzını açaraq boş-boşuna baxmaq
**gawky**[1] ['gɔ:kı] *n* 1. kəndli-kütlü; avam / kobud adam; 2. sadəlövh adam
**gawky**[2] ['gɔ:kı] *adj* 1. sarsaq, gicbəsər; 2. yöndəmsiz, biçimsiz, ağır *(adam)*
**gay**[1] [geı] *n* pederast, homoseksualist
**gay**[2] [geı] *adj* 1. şən, qəmsiz, sevincli, fərəhli; **~ voice** şən səs; **~ tune** şən /şux musiqi/hava; **~ looks** fərəhli baxışlar; 2. pozğun, azğın, əxlaqsız; **to lead a ~ life** pozğun həyat sürmək /keçirmək; 3. əlvan, parlaq, təmtəraqlı, yaraşıqlı, qəşəng; **~ colours** əlvan rənglər; **~ flowers** parlaq/ qəşəng çiçəklər;
◊ **~ science** *arx.* poeziya; **~ bird/dog** kef çəkməyi xoşlayan adam, kef həvəskarı; **~ lady** yüngül/əxlaqsız qadın; **(as) ~ as a lark** həmişə şad, gülərüz; *I don't feel very gay Özümü o qədər də yaxşı hiss etmirəm*
**gaze**[1] [geız] *n* diqqətli, zillənmiş baxış / nəzər; **at / on /the first ~** ilk baxışdan; **to stand at ~** diqqətlə baxmaq; **to turn round with a bewildered ~** çevrilib təəccüblə baxmaq; **to give *smb.* the ~** kiməsə diqqətlə baxmaq; **to be at ~** heyrət içində olmaq
**gaze**[2] [geız] *v* 1. **(at/on/upon)** diqqətlə baxmaq, gözünü zilləyib baxmaq; **to ~ at *smb.* with astonishment** bir kəsə təəccüblə baxmaq; *What are you gazing at? Nəyə belə diqqətlə baxırsan?;* 2. tamaşa etmək, seyr etmək; *Stop gazing round! Bəsdir ora-bura baxdın!*
**gazebo** [gə'zi:bou] *n (pl* **-os, -oes** [ouz]) I 1. *mem.* belveder *(binanın və ya təpənin üstündə müşahidə üçün qüllə, eyvan);* 2. aynabənd, şüşəbənd; şüşəli balkon
**gazebo** [gə'zi:bou] *n* II yeniyetmə; oğlan
**gazelle** [gə'zel] *n zool.* ahu, qəzal, ceyran
**gazer** ['geızə'] *n* 1. diqqətlə baxan adam; **star ~** ulduzları seyr edən adam, "münəccim; 2. tamaşaçı
**gazette**[1] [gə'zet] *n* 1. rəsmi mətbuat orqanı; hökumət bülleteni *(qısa, rəsmi məlumat toplusu);* üç rəsmi hökumət bülletenlərindən biri; 2. *arx.* qəzet, xəbərlər toplusu; **to be/to appear in the ~** adı qəzetdə çəkilmək, adı qəzetə düşmək *(müflis olmuş, borcunu ödəmək iqtidarında olmayan şəxslər haq.)*
**gazette**[2] [gə'zet] *v arx.* rəsmi bülletendə dərc etmək;
◊ **to be ~d** *hərb.* hər hansı bir rütbəyə layiq görülmək; **to be ~d out** *hərb.* istefaya buraxılmaq haqqında əmri qəzetdə dərc etmək
**gazetteer** [.gæzı'tıə'] *n* 1. coğrafi məlumat kitabçası; coğrafi adlar lüğəti; 2. jurnalist, qəzet işçisi
**gazon** [gə'zu:n] *n arx.* çim, qazon, yaşıl ot zolağı
**gean** [gi:n] *n bot.* 1. yabanı albalı ağacı; 2. yabanı albalı ağacının meyvəsi, gilənar
**gear**[1] [gıə'] *n tex.* 1. mexanizm, cihaz, alət; 2. ləvazimat; **hunting ~** ov, ovçuluq ləvazimatı; **fishing ~** balıq ovu ləvazimatı; 3. *av.* şassi; 4. *tex.* dişli çarx; 5. ilişdirmə, qoşma; 6. reduktor *(dişli çarxlar vasitəsilə hərəkəti bir valdan o birinə ötürən mexanizm);* **middle/top/bottom /first/second ~** orta/ən yüksək/ən aşağı/birinci/ikinci sürət; **in high ~** böyük/üçüncü sürətlə; **low ~** aşağı/birinci sürətlə; **reverse ~** geriyə hərəkət; **in ~** qoşulmuş / işləyən; **out of ~** qoşulmamış / işləməyən *(mexanizm);* 7. *məc.* pozulmuş, pozğunlaşmış; səhhəti pisləşmiş; **to get/to put/to set / to throw into ~** sürət ötürücüsünü qoşmaq; **to throw / to put/to get/to set out of ~** sürət ötürücüsünü ayırmaq; **to go into first/ second ~** birinci / ikinci sürətə keçirmək; 8. qoşqu ləvazimatı/şeyləri; 9. *arx.* daşınar əmlak
**gear**[2] [gıə'] *v* 1. ötürücü ilə təchiz etmək; 2. hərəkətə gətirmək; işə salmaq *(mexanizmi);* 3. qoşmaq *(dişli çarxları);* **~ down** ötürücü vasitəsilə hərəkəti azaltmaq; **to ~ down a car** avtomobilin sürətini azaltmaq; **to ~ up a car** avtomobilin sürətini artırmaq; **to ~ up production** məhsul istehsalını artırmaq
**gear-box** ['gıəbɔks] *n* sürət qutusu, ötürücü qutu
**gear-case** ['gıəkeıs] *n* = **gear-box**
**gear-change lever** ['gıətʃeındʒ'lı:və'] *n avt.* sürət ötürücüsünün qolu
**gear-cutter** ['gıə.kʌtə'] *n tex.* dişaçan dəzgah
**gearing-system** ['gıərıŋ'sıstəm] *n tex.* transmissiya *(hərəkəti motordan maşına nəql edən val)*
**gear-ratio** ['gıə'reıʃıou] *n tex.* hərəkəti ötürmə əmsalı
**gear-wheel** [gıəwi:l] *n tex.* dişli çarx
**gee**[1] [dʒi:] *n* atcığaz
**gee**[2] [dʒi:] *int.* 1. *həə... Di ha! Getdik!* 2. *amer. Bax belə!; Bəs belə!; Bəs belə imiş!; Tfu!; Uf!; Ah!; And suppose the lady has a date? -Gee!, I wish you'd break it! Bəs xanım görüş təyin edibsə, onda...? Uf, sən də ki...! Bu görüşü ləğv etmək olmazmı?!; Gee whizz!, Gee whillikins! d.d. Bax belə!, Əla!, Fısqırıq!*
**geese** [gi:s] *n* **goose** *isminin cəm forması*
**Gehenna** [gı'henə] *n* 1. cəhənnəm; 2. *məc.* işgəncə yeri, həbsxana
**geisha** ['geıʃə] *n* qeyşa *(yapon rəqqasəsi)*
**gelatin** [.dʒelə'tı:n] *n* 1. jelatin *(nazik və şəffaf plastinka şəklində yapışqan maddə);* 2. həlməşik *(ət və ya balıqdan bişirilən həlməşik);* jele



**gelatinate** [dʒı'lætıneıt] *v* = **gelatinize**
**gelatine** [.dʒelə'ti:n] *n* = **gelatin**
**gelatinize** [dʒı'lætınaız] *v* 1. həlməşik halına salmaq; 2. həlməşik halına düşmək
**gelatinous** [dʒı'lætınəs] *adj* jelatinli, jelatindən hazırlanmış
**gelation** [dʒı'leıʃn] *n* soyuma; donma
**geld**[1] [geld] *n* taxt-tac üçün toplanan vergi
**geld**[2] [geld] *adj* sonsuz, uşağı olmayan; axta
**geld**[3] [geld] *v* I 1. vergi qoymaq; 2. vergi vermək
**geld** [geld] *v* II *(pt* **gelded**, *pp* **gelt)** 1. axtalamaq, burmaq; 2. *məc.* zəiflətmək; məzmunsuzlaşdırmaq
**gelded** ['geldıd] *adj* axta, axtalanmış, buruq; **a ~ cock /horse/pig** axta xoruz/at/ donuz; **a ~ ram** buruq / axta qoç
**gelding** ['geldıŋ] *n* 1. axtalanmış heyvan; 2. xədim, hərəmağası, xacə; 3. axtalama, burma
**gelid** ['dʒelıd] *adj* 1. soyuq, buz kimi *(rəftar, ton, davranış haq.);* 2. dondurucu, buzlaşdırıcı, üşüdücü
**gem**[1] [dʒem] *n* 1. qiymətli daş, əlvan daş; cəvahirat, daş-qaş; **real ~** əsl / təmiz daş-qaş; **artificial/false ~** süni daş; 2. *məc.* ən qiymətli şey, inci, gözü *(bir şeyin);* **the ~ of the collection** kolleksiyanın gözü; *This poem is simply a gem Bu şer sadəcə olaraq bir incidir; This girl is simply a gem Bu qız lap incidir;* 3. gemma *(üstündə yazı və ya şəkil qazılmış qiymətli daş);* 4. *amer.* şit yağlı bulka
**gem**[2] [dʒem] *v* qiymətli daş-qaşla süsləmək /bəzəmək; **to ~ with rubies** yaqutla süsləmək/bəzəmək
**geminate**[1] ['dʒemınıt] *n fon.* qoşa samit
**geminate**[2] ['dʒemınıt] *adj* qoşalaşmış, cütləşmiş; cüt, ikiqat
**geminate**[2] ['dʒemıneıt] *v* qoşalamaq, cütləmək; ikiqat etmək
**gemination** [.dʒemı'neıʃn] *n* qoşalaşma; qoşalaşdırma
**Gemini** ['dʒemınaı] *n astr.* Əkizlər bürcü
**gemma** ['dʒemə] *n (pl* **-ae)** *bot.* tumurcuq, düymə, puçur
**gemmate**[1] ['dʒemıt] *adj* tumurcuqlanma yolu ilə artan *(mikroorqanizmlər haq.)*
**gemmate**[2] ['dʒemeıt] *v* tumurcuqlanmaq; tumurcuqlanma yolu ilə artmaq *(mikroorqanizmlər haq.)*
**gemmation** [dʒe'meıʃn] *n* tumurcuqlanma yolu ilə artma *(mikroorqanizmlər); bot.* tumurcuğun əmələ gəlməsi
**gemmiparous** [dʒe'mıpərəs] *adj bot.* tumurcuqlanma ilə çoxalan
**gendarme** ['ʒa:nda:m] *n* jandarm
**gendarmerie** [ʒa:n'da:mərı] *n* jandarmeriya
**gendarmery** [ʒa:n'da:mərı] *n* = **gendarmerie**
**gender**[1] ['dʒendə'] *n qram.* cins; **masculine /feminine ~** kişi/qadın cinsi; **neuter/ grammatical ~** orta / qrammatik cins; *What is the gender of this noun? Bu isim hansı cinsə aiddir?*
**gender**[2] ['dʒendə'] *v şair.* doğmaq, törəmək; yaratmaq
**gene** [dʒi:n] *n biol.* gen, qan yaddaşı
**genealogic** [.dʒi:njə'lɔdʒık] *adj* genealogiya, nəsil; **~ tree/table** nəsil şəcərəsi/ağacı, soy ağacı
**genealogical** [.dʒi:njə'lɔdʒıkəl] *adj* = **genealogic**
**genealogy** [.dʒi:nı'ælədʒı] *n* 1. genealogiya, nəsil /soy tarixi; 2. nəsil/soy tarixini öyrənən yardımçı elm; 3. şəcərə, nəsil / soy şəcərəsi
**general**[1] ['dʒenərəl] *n* 1. general; **~ of the army** ordu generalı; 2. *din.* orden /təriqət başçısı; 3. *arx.* **the ~** xalq;
◊ **~'s battle** nəticəsi komandanlığın bacarığından asılı olan döyüş
**general**[2] ['dʒenərəl] *adj* 1. ümumi, ümumi səciyyəli; **a matter of ~ interest** ümumi maraq doğuran məsələ, hamı üçün maraqlı olan məsələ; **a word that is in ~ use** hamı tərəfindən işlədilən söz; *I have a general idea of what the book is about Bu kitabın nə haqqında olması barədə mənim ümumi məlumatım var;* **~ meeting** ümumi yığıncaq; **~ education** ümumi təhsil; **~ elections** ümumi seçkilər; **~ impression** ümumi təəssürat; **~ strike** ümumi/hamılıqla tətil; **~ hospital** ümumi xəstəxana; 2. geniş, hərtərəfli; **~ counter-attack** geniş əks-hücum; *There was a general panic Ümumi panika /təşviş/həyəcan vardı; The cold weather has been general Soyuq havanın acısını hamı çəkmişdi, Soyuq havanı ölkənin hər yerində hiss etmişlər;* **~ word** adi *(hamı tərəfindən qəbul edilən)* söz; **as a ~ rule** bir qayda olaraq, adətən; *The general idea is that... Hamı belə hesab edir ki,...;* 3. baş, əsas; **~ committee** rəyasət heyəti *(BMT-də);* **Director General, General Manager** baş direktor; **General Commanding Officer** birləşmiş qoşun komandiri; **General Headquarters** baş qərargah; **General Staff** ümumi qərargah; **General Assembly** Baş Məclis;
◊ **in ~** ümumiyyətlə; **in the ~** əsasən; **~ practitioner** loğman, can həkimi; terapevt və cərrah kimi fəaliyyət göstərən həkim; **~ post/delivery** səhər poçtu
**General-in-Chief** ['dʒenərəlın'tʃı:f] *n* baş komandan
**generality** [.dʒenə'rælıtı] *n* 1. ümumilik; 2. qeyri-müəyyənlik; 3. əksəriyyət, çox hissəsi; **the ~ of voters** seçicilərin əksəriyyəti
**generalization, -isation** [.dʒenərəlaı'zeıʃn] *n* 1. ümumiləşdirmə; *Don't be hasty in generalization Ümumiləşdirməyə tələsmə/tələsməyin;* 2. ümumi qayda
**generalize, -ise** ['dʒenərəlaız] *v* 1. ümumiləşdirmək, ümumi bir nəticəyə gəlmək; **to ~ from facts** faktlar əsasında ümumi nəticəyə gəlmək; 2. şamil /aid etmək; yaymaq; **to ~ the use of a new method** yeni üsulun işlənməsini yaymaq

**generally** [ˈdʒenərəlı] *adv* **1.** adətən, adət üzrə, bir qayda olaraq; *I generally get up at six o'clock Mən bir qayda olaraq saat 6-da dururam;* **2.** ümumiyyətlə; ~ **speaking** ümumiyyətlə desək; **3.** əsasən, əksər hallarda; hər yerdə; *The new plan was generally welcomed Yeni plan hər yerdə xoş qarşılandı;* ~ **received** hamı tərəfindən qəbul edilmiş

**general-purpose** [ˈdʒenrəlˈpɜ:pəs] *adj* universal, ümumi təyinatlı, çoxməqsədli; **a** ~ **tractor** universal/çoxməqsədli traktor

**generalship** [ˈdʒenərəlʃıp] *n* **1.** generallıq, general rütbəsi; **2.** hərb sənəti / peşəsi; **3.** məharətli / bacarıqlı rəhbərlik; **due to brilliant** ~ məharətli rəhbərlik sayəsində

**generate** [ˈdʒenəreıt] *v* **1.** səbəb olmaq, əmələ gətirmək; *His attitude generates opposition Onun davranışı etiraza səbəb olur / etiraz doğurur;* **2.** əmələ gətirmək, doğurmaq, generasiya etmək; **to** ~ **heat** istilik hasil etmək; *Friction generates heat Sürtünmə istilik əmələ gətirir/yaradır*

**generation** [.dʒenəˈreıʃn] *n* **1.** nəsil; **the rising** ~ böyüyən nəsil; **the lost** ~ itirilmiş nəsil; **the young** ~ gənc nəsil; ~**s yet unborn** gələcək/hələ doğulmamış nəsillər; **2.** dövr (≅ 30 il); **a** ~ **ago** bir nəsil / 30 il bundan əvvəl; **3.** qəbilə, soy, nəvə-nəticə; **he and his** ~ o və onun törəmələri/nəvə-nəticələri; **4.** *biol.* artma, çoxalma, törəmə; ~ **of bacteria** bakteriyaların artması/ çoxalması; **5.** istehsal, əmələ gəlmə; **the** ~ **of electricity** elektrik enerjisi istehsalı

**generative** [ˈdʒenərətıv] *adj* istehsal edən, istehsaledici; ~ **cell** *biol.* cinsiyyət hüceyrəsi əmələ gətirən

**generator** [ˈdʒenəreıtə] *n* istehsal edən, enerji mənbəyi; generator *(elektrik enerjisi hasil edən mexanizm)*

**generic** [dʒıˈnerık] *adj biol.* **1.** ata-baba, soy; **a** ~ **name** soy adı; **2.** ümumi; ~ **term** ümumi işarə / ələmət; ~ **character** ümumi xassə/xüsusiyyət

**generical** [dʒıˈnerıkəl] *adj* = **generic**

**generosity** [.dʒenəˈrɔsıtı] *n* **1.** alicənablıq, mərdlik, comərdlik; **to show** ~ alicənablıq göstərmək; **to do** *smth.* **out of pure** ~ bir işi tamamilə təmənnasız görmək; **2.** mərd hərəkət

**generous** [ˈdʒenərəs] *adj* **1.** alicənab, mərd, comərd; ~ **nature** mərd xasiyyət; ~ **conqueror** comərd/alicənab qalib; *It was generous of them to share their meal with their out-of-work neighbours Öz yeməklərini işsiz qonşuları ilə bölüşdürmələri onlar tərəfdən alicənablıq idi; He has a generous nature O təbiətcə mərddir;* **2.** əliaçıq, səxavətli; **to be** ~ **with** *one's* **money** pul xərcləməkdə əliaçıq olmaq; *He is generous with his money O, pul xərcləməkdə çox əliaçıqdır;* **3.** bol; ~ **harvest** bol məhsul; **4.** böyük *(ölçü haq.)*; ~ **of size** böyük ölçüdə; **5.** çoxlu, çox, xeyli *(pul haq.)*; ~ **allowance** xeyli təqaüd pulu; xeyli məbləğdə cibxərcliyi; **6.** məhsuldar *(torpaq haq.)*; **7.** sıx *(gül haq.)*; **8.** spirtli, köhnə *(içki haq.)*

**genesis** [ˈdʒenısıs] *n (pl* **-ses)** **1.** mənşə, əmələ gəlmə, genezis; **2.** Genesis *din.* Əhdi-ətiqin birinci kitabı *(Bibliyanın birinci kitabı)*

**genetic** [dʒıˈnetık] *adj* genetik, genetika; ~ **relation** genetik əlaqə

**genetically** [dʒıˈnetıkəlı] *adv* mənşə etibarilə, mənşəcə

**geneticist** [dʒıˈnetəsıst] *n* genetik, genetika üzrə mütəxəssis

**genetics** [dʒıˈnetıks] *n* genetika

**genial** [ˈdʒi:njəl] *adj* I **1.** xeyirxah, xoşxasiyyət, rəhmli; **a** ~ **old man** xeyirxah qoca; **a man with a** ~ **character** xoşxasiyyət adam; **2.** mülayim, yumşaq *(hava və s. haq.)*; ~ **weather** mülayim hava; **a** ~ **day** xoş / mülayim gün

**genial** [dʒıˈnaıəl] *adj* II *anat.* çənə

**geniality** [.dʒi:nıˈælıtı] *n* **1.** xeyirxahlıq, xoşxasiyyətlik, səmimilik, sevinc; **2.** mülayimlik *(hava haq.)*

**genie** [ˈdʒi:nı] *n (pl* **~s**, *həm də* **genii)** cin, əcinnə

**genii** [ˈdʒi:nıaı] *n* **genie** *isminin cəmi*

**genista** [dʒıˈnıstə] *n bot.* naz *(sarıçiçəkli çöl bitkisi)*

**genital** [ˈdʒenıtl] *adj anat.* cinsiyyət

**genitals** [ˈdʒenıtlz] *n anat.* cinsiyyət/tənasül orqanları

**genitive** [ˈdʒenıtıv] *adj qram.* yiyəlik; ~ **case** yiyəlik hal

**genius** [ˈdʒi:njəs] *n (pl həm də* **-nii)** **1.** dahilik, istedadlılıq, zəka; **a man of** ~ dahi şəxs; **the impress of** ~ dahilik əlaməti; **2.** *(pl* **-niuses)** dühа, dahi, dahi şəxsiyyət/ adam; *Einstein was a mathematical genius Eynşteyn riyaziyyat dahisi idi;* **3.** *həm sing.* bacarıq, istedad, talant, qabiliyyət; ~ **for acting** artistlik bacarığı; **to have a** ~ **for music** böyük musiqi qabiliyyətinə malik olmaq; **to have a** ~ **for making friends** dost qazanmaq qabiliyyətinə malik olmaq; **4.** *(pl* **-nii)** cin, şeytan, əcinnə, iblis; ruh, pəri; **good** ~ xeyirxah adam; **evil** ~ şər adam; **5.** *(pl* **-niuses)** ruh, can, mənəviyyat *(zamanın, günün, millətin, qanunun, dilin və s.)*; **the French** ~ fransız xalqının mənəviyyatı; **the** ~ **of the British Constitution** Britaniya ana yasasının / konstitusiyasının ruhu / canı; *War is repugnant to the genius of the people Müharibə xalqın mənəviyyatına ziddir*

**genocide** [ˈdʒenousaıd] *n* soyqırım, qətlyam, genosid *(irqi, milli zəmində əhalinin, ayrı-ayrı milli qrupların məhv edilməsi)*; **the Khojali** ~ Xocalı qətlyamı *(26 II. 1992-ci ildə erməni və rus qoşunları tərəfindən Azərbaycanın Xocalı şəhəri və onun əhalisi tamamilə məhv edilib)*

**genre** [ʒa:ŋr] *n fr.* **1.** ədа, adət, tövr, tərz; **2.** janr, bədii əsər növü; **3.** məişət təsvir edən şəkil; **4.** ədəbiyyatda məişət təsviri; **5.** bədii xüsusiyyət, tərz, üslub; ~ **painting** məişət şəkli, adi həyat təsviri



**genre-piece** [ˈʒa:ŋrpi:s] *n* məişət təsvir edən şəkil, məişət şəkli

**gent**[1] [dʒent] *n* = **gentleman**

**gent**[2] [dʒent] *adj* qəşəng, zərif, nazik

**genteel** [dʒenˈti:l] *adj* **1.** alicənab, kübar, ədəbli; **2.** *isteh.* nazlı, əzilib-büzülən, özünü naza qoyan, süni olaraq özünü kübar cəmiyyətinin ədəb və adətlərinə müvafiq aparan; **living in** ~ **poverty** çox kasıb olsa da özünü kübar tərzində aparan

**gentile** [ˈdʒentaıl] *n* **1.** *bibl.* yəhudi olmayan şəxs; **2.** *amer.* mormon olmayan şəxs; **3.** mormon təriqəti *(Şimali Amerikada çoxallahlılıqla xristianlığın qarışığından ibarət dini təriqət)*, bütpərəst, bütə sitayiş edən adam

**gentilic** [dʒenˈtılık] *adj* **1.** milli; qəbiləyə məxsus; **2.** bütpərəstlik, bütə sitayiş edən

**gentility** [dʒenˈtılıtı] *n* I **1.** kübarlıq, zəriflik; kübarlıq iddiası, aristokrat şakəri / ədası; **shabby** ~ kasıb bir vəziyyətdə öz kübarlıq vərdişlərini saxlamağa cəhd; **2.** ad-san, əsillik, zadəganlıq

**gentility** [dʒenˈtılıtı] *n* II **1.** qohumluq, qohumluq münasibəti; **2.** *arx.* nəsil, qəbilə

**gentle**[1] [ˈdʒentl] *n zool.* milçək sürfəsi

**gentle**[2] [ˈdʒentl] *adj* **1.** yumşaq, mülayim, xoşxasiyyət, incə, həlim, quzu kimi; ~ **nature** mülayim xasiyyət; ~ **heart** yumşaq ürək; ~ **look** quzu baxışı; ~ **voice** həlim səs; ~ **call** mehriban çağırış; ~ **touch** incə tumar; **2.** həzin, sakit, aram, arxayın; ~ **music** həzin musiqi; ~ **river** sakit axan çay; **3.** zəif, xəfif; ~ **heat** mötədil/mülayim istilik; ~ **breeze** xəfif külək, meh; ~ **rustle in the grass** otların xəfif xışıltısı; **4.** meylli, maili, azenişli; ~ **slope** maili eniş; **5.** əsilzadə, əsil, nəcib; ~ **blood** qanı təmiz; **a person of** ~ **birth** əsilzadə

**gentle**[3] [ˈdʒentl] *v* **1.** yumşaltmaq; sakitləşdirmək; **2.** cinsini yaxşılaşdırmaq; cinsləşdirmək; **3.** öyrətmək, yerişə/miniyə öyrətmək *(atı)*

**gentlefolk** [ˈdʒentlfouk] *n arx.* *(Özündən sonra fel cəmdə işlənir)* zadəganlıq, aristokratiya, əyanlar, zadəganlar

**gentlehood** [ˈdʒentlhud] *n* **1.** alicənablıq, nəciblik, ad-san, əsillik; **2.** tərbiyə, ədəb, nəzakət, mərifət, qanacaq; gülərüzlülük, iltifat, lütfkarlıq

**gentleman** [ˈdʒentlmən] *n (pl* **-men** [-mən]) **1.** centlmen, yaxşı tərbiyəli şəxs; **true** ~ əsl centlmen; *He is a gentleman in every inch of him O, başdan ayağa / təpədən dırnağa qədər/xalis centlmendir; There is nothing of the gentleman about him Onda centlmenlikdən əsər-əlamət yoxdur;* **2.** ağa, cənab, kişi, adam; **young** ~ cavan oğlan; **stout** ~ kök kişi; **old** ~ yaşlı adam; *Who is the gentleman in the corner? O küncdəki adam kimdir?; For gentlemen only! Yalnız kişilər üçün! (elan);* **the Honourable Gentleman** Hörmətli Cənab *(parlament üzvünə müraciət)*; **the Right Honourable Gentleman** Çox hörmətli cənab *(parlament çıxışlarında gizli Kral şurası üzvünə müraciət)*; **the** ~ **from Texas** Texas ştatının nümayəndəsi *(nümayəndələr palatasında)*; *Ladies and Gentlemen! Xanımlar və bəylər! (müraciət)*;

◊ **gentleman's/gentlemen's agreement** kişi sözü, centlmen razılaşması; ~ **of the cloth** ruhani, kilsə xadimi, keşiş; ~ **of the gown/ of the long robe** hüquqşünas alim; ~ **of the inkpot** qəzet müxbiri / qəzetçi; ~ **of the road** quldur, yolkəsən; **old** ~, ~ **in black** şeytan, iblis, məlun; ~ **in brown** taxtabiti; ~ **in black velvet** köstəbək, kor siçan

**gentlemanhood** [ˈdʒentlmənhud] *n* centlmenlik, zadəganlıq

**gentlemanlike** [ˈdʒentlmənlaık] *adj* centlmen kimi, nəzakətli, qanacaqlı, tərbiyəli; *His behaviour was not fair, not gentlemanlike Onun hərəkəti nəzakətsiz, centlmenə yaraşmayan hərəkət idi*

**gentlemanly** [ˈdʒentlmənlı] *adj* = **gentlemanlike**

**gentlewoman** [ˈdʒentl.wumən] *n (pl* **-.women** [-wımın]) **1.** xanım; **2.** zadəgan qadın

**gently** [ˈdʒentlı] *adv* **1.** yumşaqlıqla, yumşaq, mülayim, sakitcə, sakit; qısaca, müxtəsər surətdə; nəvazişlə, incəliklə, sevə-sevə, şəfqətlə; **to answer** ~ nəzakətlə cavab vermək; **to speak** ~ nəvazişlə/ədəblə danışmaq; *Speak gently to the child Uşaqla mülayim/nəvazişlə danış/danışın;* **2.** ehtiyatla, asta-asta, astaca, yavaşca, yavaş-yavaş; *Open the door gently! Qapını astaca aç!/açın!; Close the door gently! Qapını ehmalca bağla!/bağlayın!; Gently! Sakit!;* **3.** meylli, az eniş; *The road sloped gently to the sea Yol tədricən aşağı - dənizə enirdi;* ~ **born** əsilli, nəcabətli; ~ **bred** əsilzadə/zadəgan tərbiyəsi almış, gözəl tərbiyə almış

**Gentoo** [dʒenˈtu:] *n (pl* **-oos** [-u:z]) **1.** hindi, hindu, Məhəmməd hümməti olmayanlar, qeyri-müsəlmanlar; **2.** hindi dilləri *(Hindistanın cənubunda işlənən bəzi dillərin adı)*

**gentry** [ˈdʒentrı] *n* **1.** kiçik mülkü olan titulsuz zadəganlar; **2.** *zaraf.* müəyyən insan qrupu; **these** ~ bu cənablar;

◊ **the flash** ~ oğrular; **the light-fingered** ~ cibgirlər; **the red-coated** ~ *arx.* ingilis əsgərləri; **the silk-stocking** ~ varlılar, varlı adamlar

**gents** [ˈdʒents] *n d.d.* kişi ayaqyolu/tualeti

**genu** [ˈdʒi:nju:] *n (pl* **genua)** *anat.* diz, diz bükümü

**genual** [ˈdʒi:njuəl] *adj anat.* diz, dizə məxsus

**genuflect** [ˈdʒenjuflekt] *v* diz çökmək; diz çöküb ibadət etmək, səcdə etmək/qılmaq, səcdəyə düşmək *(ibadət zamanı)*

**genuflection** [ˌdʒenjuˈflekʃn] *n* = **genuflexion**
**genuflexion** [ˌdʒenjuˈflekʃn] *n* diz çökmə, səcdə *(ibadət zamanı)*
**genuine** [ˈdʒenjuɪn] *adj* **1.** əsl, həqiqi, orijinal; **a ~ picture by Rubens** Rubensin çəkdiyi şəklin orijinalı; **the ~ text of the treaty** müqavilə mətninin əsli; **~ pearls** əsl mirvari; **~ wool** təmiz yun; **2.** səmimi; **~ sorrow** səmimi kədər
**genuinely** [ˈdʒenjuɪnlɪ] *adv* səmimiyyətlə, ürəkdən, səmimi qəlbdən; **to be ~ sorry** ürəkdən kədərlənmək; **to be ~ happy** böyük sevinc hissi keçirmək, xoşbəxt olmaq
**genuineness** [ˈdʒenjuɪnnɪs] *n* **1.** əsllik, orijinallıq, həqiqilik; **the ~ of this picture** bu şəklin orijinallığı; **2.** səmimilik, düzlük, səmimiyyət; **the ~ of *smb.'s* character** bir kəsin xarakterinin səmimiliyi/düzlüyü
**genus** [ˈdʒi:nəs] *n (pl* **genera)** **1.** *biol.* nəsil, soy; **the ~ Homo** insan nəsli, bəşəriyyət; **2.** növ, cür, qism, qəbil
**geo** [ˈdʒi:ou] *Yunanca "yer" mənası bildirən mürəkkəb söz komponenti. Azərbaycan türkcəsində "geo" komponentinə uyğun gəlir*
**geobotanical** [ˌdʒi:oubəˈtænɪkəl] *adj* geobotanikaya aid olan, botanika coğrafiyasına aid olan
**geocentric** [ˌdʒi:ouˈsentrɪk] *adj* geosentrik *(Yerin mərkəzinə aid olan)*
**geochemistry** [ˌdʒi:ouˈkemɪstrɪ] *n* geokimya *(Yer qatlarının kimyəvi tərkibini öyrənən elm)*
**geodesy** [dʒi:ˈɔdɪsɪ] *n* geodeziya *(Yerin forma və ölçüsünü öyrənən və yer səthinin böyük sahələrini ölçüb planını çəkməklə məşğul olan elm)*
**geographer** [dʒɪˈɔgrəfəʳ] *n* coğrafiyaçı, coğrafiyaşünas
**geographic** [dʒɪəˈgræfɪk] *adj* = **geographical**
**geographical** [dʒɪəˈgræfɪkəl] *adj* coğrafi; **~ mile** dəniz mili *(1,6 km)*; **~ expression** coğrafi anlayış/məfhum; **~ demarcation** coğrafi rayonlaşdırma; **~ research** coğrafi tədqiqat/araşdırma; **~ features** coğrafi xüsusiyyətlər
**geography** [dʒɪˈɔgrəfɪ] *n* coğrafiya; **physical/political ~** fiziki /siyasi coğrafiya; **the ~ of the Mars** Marsın coğrafiyası
**geologic** [dʒɪəˈlɔdʒɪk] *adj* geoloji, geologiyaya aid; **~ high / low** son / qədim geoloji çöküntülər təbəqəsinə aid
**geological** [dʒɪəˈlɔdʒɪkəl] *adj* = **geologic**
**geologist** [dʒɪˈɔlədʒɪst] *n* geoloq, geologiya mütəxəssisi
**geologize** [dʒɪˈɔlədʒaɪz] *v* geologiya ilə məşğul olmaq; geoloji tədqiqat aparmaq
**geology** [dʒɪˈɔlədʒɪ] *n* geologiya
**geomagnetic** [ˌdʒɪ:oumægˈnetɪk] *adj* geomaqnetik; **~ field** geomaqnetik sahə *(Yerin maqnit sahəsi)*
**geomagnetical** [ˌdʒɪ:oumægˈnetɪkəl] *adj* = **geomagnetic**
**geometrical** [dʒɪəˈmetrɪkəl] *adj* həndəsi; **~ figures** həndəsi fiqurlar
**geometrically** [dʒɪəˈmetrɪkəlɪ] *adv* həndəsi cəhətdən, həndəsi qanunlara əsasən
**geometry** [dʒɪˈɔmɪtrɪ] *n* həndəsə; **descriptive ~** tərsimi həndəsə; **plane ~** planimetriya *(həndəsənin səth üzərindəki fiqurlarından bəhs edən hissəsi)*; **solid ~** stereometriya *(həndəsənin səthlərin və cisimlərin fəzada qarşılıqlı vəziyyətindən bəhs edən şöbəsi)*; **~ book** həndəsə kitabı
**geomorphology** [ˌdʒi:oməˈfɔlədʒɪ] *n* geomorfologiya *(coğrafiyanın Yer səthinin forması, Yerin xarici görünüşü, onun əmələ gəlməsini və onun inkişafını öyrənən sahəsi)*
**geophysical** [ˌdʒɪ:ouˈfɪzɪkəl] *adj* geofiziki
**geophysics** [ˌdʒi:ouˈfɪzɪks] *n* geofizika *(Yer kürəsinin fiziki xassələrindən və onda baş verən fiziki hadisələrdən bəhs edən elm)*
**geopolitics** [ˌdʒɪ:əˈpɔlɪtɪks] *n* geopolitika
**George** [dʒɔ:dʒ] *n* **1.** müqəddəs Georgi; **2.** *av. jarq.* avtopilot *(uçağı öz-özünə/ avtomatik idarə edən aparat)*; **3.** böyük saxsı su qabı *(həm də* **Brown ~***)*;
◊ **St. ~'s day** müqəddəs Georgi günü *(23 aprel)*; *By George! Allah haqqı!, Vicdan haqqı!; Bax belə ha!; Əcəb işdir!, Lənət sənə!, Lənətə gələsən!*
**Georgian**[1] [ˈdʒɔ:dʒjən] *n* I **1.** gürcü *(xalq)*; **the ~s** gürcülər; **2.** gürcü dili
**Georgian**[2] [ˈdʒɔ:dʒjən] *adj* I gürcü
**Georgian** [ˈdʒɔ:dʒjən] *n* II Corciya ştatı əhli, Corciya ştatında doğulmuş şəxs
**Georgian** [ˈdʒɔ:dʒjən] *adj* III Corciya ştatına aid olan
**Georgia pine** [ˌdʒɔ:dʒjəˈpaɪn] *n bot.* bataqlıq şamı *(ağac)*
**georgic**[1] [ˈdʒɔ:dʒɪk] *n* **1.** kəndli; **2.** kənd mövzusuna həsr edilmiş şer
**georgic**[2] [ˈdʒɔ:dʒɪk] *adj* kənd, kəndə aid olan
**geranium** [dʒɪˈreɪnjəm] *n bot.* ətirşah
**gerfalcon** [ˈdʒə:ˌfɔ:lkən] *n zool.* şunqar *(quş)*
**gerget** [ˈdʒə:dʒɪt] *n bayt.* yelinin hov çəkməsi
**germ**[1] [dʒə:m] *n* **1.** *biol.* rüşeym, embrion, döl; **in ~** rüşeymdə; **2.** *bot.* tozlanma, barverən tumurcuq; **3.** mikrob, bakteriya; **free from ~s** dezinfeksiya edilmiş, zərərsizləşdirilmiş; **~ war /warxfare** bakterioloji *(silahlarla aparılan)* müharibə
**germ**[2] [dʒə:m] *v* cücərmək, inkişaf etmək
**German**[1] [ˈdʒə:mən] *n* **1.** alman *(xalq)*; **the ~s** almanlar; **2.** alman dili; **High ~** ədəbi alman dili; **Low ~** danışıq alman dili
**German**[2] [ˈdʒə:mən] *adj* alman, nemes;
◊ **~ Ocean** *arx.* Şimal dənizi
**German badger-dog** [ˈdʒə:mənˈbædʒədɔg] *n* taksa *(əyriqıç kiçik it cinsi)*
**germane** [dʒə:ˈmeɪn] *adj* yerli, yerində, münasib; **~ remark** yerli irad, yerində edilmiş irad
**Germanic**[1] [dʒə:ˈmænɪk] *n dilç.* ümumgerman dili



**Germanic**[2] [dʒə:ˈmænɪk] *adj* **1.** german, alman; **2.** tevtonlara məxsus, german, almanlara aid
**Germanism** [ˈdʒə:mənɪzm] *n* **1.** germanizm; **2.** almanpərəstlik
**Germanization** [ˌdʒə:mənaɪˈzeɪʃn] *n* almanlaşdırma; almanlaşdırılma, nemesləşdirmə
**Germanize** [ˈdʒə:mənaɪz] *v* **1.** almanlaşmaq; **2.** almanlaşdırılmaq
**German measles** [ˈdʒə:mənˈmi:zlz] *n tib.* qızılca məxmərəyi
**German shepherd dog** [ˈdʒə:mənˈʃepəd' dɔg] *n* alman qoyun /çoban iti
**germ-carrier** [ˈdʒə:mˌkærɪəʳ] *n* basildaşıyan, basilyayan, mikrobyayan
**germ-cell** [ˈdʒə:msel] *n biol.* rüşeym hüceyrəsi
**germicide**[1] [ˈdʒə:mɪsaɪd] *n* bakteriyaları məhvedici maddə, bakterisid dərmanlar
**germicide**[2] [ˈdʒə:mɪsaɪd] *adj* bakteriyaları məhv edən
**germinal** [ˈdʒə:mɪnl] *adj biol.* rüşeym, rüşeym halında olan, embrion, döl
**germinate** [ˈdʒə:mɪneɪt] *v* **1.** tumurcuqlanmaq; cücərmək, göyərmək; **2.** cücərtmək, göyərtmək; **3.** əmələ gətirmək, törətmək, həyat vermək
**germination** [ˌdʒə:mɪˈneɪʃn] *n* **1.** cücərtmə, göyərtmə, cücərdilmə; **2.** cücərmə, göyərmə; **3.** əmələ gəlmə, törəmə, böyümə, çiçəkləmə; **a time of ~** böyümə / inkişaf dövrü; **4.** *k.t.* cücərmə / göyərmə qabiliyyəti; **~ chamber = germinator**; **~ dish** *k.t.* toxumları cücərtmək üçün tabaq
**germinative** [ˈdʒə:mɪnətɪv] *adj* **1.** cücərən, göyərən, böyüyən, tumurcuqlanan; **2.** inkişaf edən; **3.** yaşamağa qabil, həyat qabiliyyəti olan
**germinator** [ˈdʒə:mɪneɪtəʳ] *n* termostat, toxumları cücərtmək üçün sabit temperatur rejimi saxlamaq üçün cihaz
**gerontology** [ˌdʒerənˈtɔlədʒɪ] *n* gerontologiya *(qocalıq və qocalıq yaşının xəstəlikləri haqqında elm)*
**gerrymander**[1] [ˈdʒerɪmændəʳ] *n* **1.** seçkiqabağı fırıldaqlar; **2.** fırıldaq, hiylə, saxtakarlıq
**gerrymander**[2] [ˈdʒerɪmændəʳ] *v* **1.** seçkiqabağı fırıldaq işlətmək/kələk gəlmək; **2.** faktları təhrif etmək, saxtalaşdırmaq; əyri yollarla üstünlük əldə etməyə çalışmaq
**gerund** [ˈdʒerənd] *n qram.* Cerund *(felin şəxssiz formalarından biri)*
**gerund-grinder** [ˈdʒerəndˌgraɪndəʳ] *n* **1.** *istehz.* Latın dili qrammatikası müəllimi; **2.** vasvası / xırdaçı / pedant müəllim
**gesso** [ˈdʒesou] *n* gips *(ağ və ya sarı rəngli mineral)*
**Gestapo** [gesˈta:pou] *n* gestapo *(nasist rejimi zamanı Almaniyada gizli dövlət polisi)*
**gestation** [dʒesˈteɪʃn] *n* **1.** hamiləlik; hamiləlik dövrü; **2.** *məc.* yetkinləşmə, təkmilləşmə *(plan, layihə və s. haq.)*
**gesticulate** [dʒeˈstɪkjuleɪt] *v* əl-qol ilə hərəkət etmək, əl-qolunu oynatmaq, əl-qolunu ölçmək
**gesticulation** [dʒesˌtɪkjuˈleɪʃn] *n* əl-qol hərəkətləri; danışarkən əl-qolunu oynatma, başını tərpətmə
**gesture**[1] [ˈdʒestʃəʳ] *n* **1.** jest *(əl-qol hərəkəti)*; **2.** jest *(nümayiş məqsədilə edilən bir iş, hərəkət, addım)*; **fine ~** xeyirxah jest/ hərəkət; **warlike ~** davakar jest, meydan oxuma/sulama; *There is grace and dignity in each of her gestures Onun hər bir hərəkətindən nəciblik və ləyaqət yağır*
**gesture**[2] [ˈdʒestʃəʳ] *v* əl-qolunu oynatmaq, əl-qolunu/əllərini ölçmək, əl-qol ilə hərəkət etmək/danışmaq
**get**[1] [get] *n* **1.** törəmə, bala, bala alma, artım *(heyvanlarda)*; **2.** *d.d.* məvacib, əməkhaqqı; **3.** gəlir
**get**[2] [get] *v (pt pp* **got**, *amer. pp* **gotten)** **1.** əldə/hasil etmək, çıxartmaq, tapmaq; **to ~ tickets** bilet əldə etmək; **to ~ coal** kömür çıxartmaq; **to ~ fish** balıq tutmaq; *Get me some ink! Mənə mürəkkəb gətir/gətirin*; **2.** əldə etmək, almaq, qazanmaq *(tərif, şöhrət, qələbə və s.)*; nail olmaq; **to ~ the name** ad qazanmaq; *His invention got him fame İxtirası ona şöhrət gətirdi*; **to ~ the victory** qələbə çalmaq/qazanmaq; **to ~ the liberty** azadlığa nail olmaq; **to ~ an advantage over *smb.*** bir kəs qarşısında üstünlük qazanmaq; *You'll get nothing by it Sən/Siz bununla heç nəyə nail olmayacaqsan/olmayacaqsınız*; **to ~ permission from *smb.* to do *smth.*** bir şey etmək üçün bir kəsdən icazə almaq; **3.** almaq, götürmək; *I get letters every day Mən hər gün məktublar alıram*; **to ~ a leave** məzuniyyət götürmək; **4.** qazanmaq; **to ~ a living** dolanışıq *(pulu)* qazanmaq; *I will see what I can get for it Baxaq görək bunun üçün mənə nə qədər verəcəklər*; **5.** çatmaq, gəlib çatmaq, varid olmaq; *We cannot get to Baki tonight Biz bu axşam Bakıya çata bilməyəcəyik*; **6.** başa düşmək, anlamaq; *I don't get you Mən səni / sizi başa düşmürəm; You got me wrong Sən/siz məni səhv başa düşdün / düşdünüz; I don't get your meaning Mən sənin / sizin nə demək istədiyini / istədiyinizi başa düşmürəm; Did you get it?, Got me? Başa düşdünmü?/düşdünüzmü?*; **7.** hiss etmək, duymaq, tutmaq, sezmək; *Did you get the look on his face? Sən/Siz onun üzündəki ifadəni hiss etdinmi? / etdinizmi?*; **8.** nəzərinə çatdırmaq, təsir etmək; *That's got him! Bu ona çatdı!; What's got him? Ona nə olub?*; **9.** çaşdırmaq, çətin vəziyyətə salmaq; *This problem gets me Bu məsələ məni çətin vəziyyətə salır; You've got me Məni əcəb işə saldın*; **10.** dəymək, toxunmaq; *The blow got him in the nose Zərbə onun burnuna dəydi*; **11.** yoluxmaq, tutmaq; **to ~ a cold** soyuqlamaq; **to ~ measles** qızılca tutmaq; **12.** məruz qalmaq, iş almaq; *He got six years O, altı il iş aldı, O, altı il həbs cəzası aldı*; **to ~ the chair** elektrik stulu vasitəsilə ölüm cə-

zasına məhkum olunmaq; **13.** hesablamaq, hesablayıb tapmaq, almaq; *We get 1.5 as the average Orta hesabla bizdə 1.5 alınır; When we add two and two we get four Ikinin üstünə iki gələndə biz dörd alırıq*; **14.** əlaqə saxlamaq, calaşmaq; *Did you get Paris? Parislə əlaqə saxladınmı?/saxladınızmı?; The line was busy and we couldn't get him Rabitə xətti məşğul idi və biz onunla əlaqə saxlaya bilmədik;* **15.** öyrənmək, əzbərləmək, yadda saxlamaq; **to ~ *smth.* by heart** bir şeyi əzbər öyrənmək; *She's got it by heart O bunu əzbər öyrənib;* **16.** yemək; *Get your dinner! Naharını/ Naharınızı ye! / yeyin!;* **17.** doğmaq, törəmək *(heyvanlar haq.);* **18.** aparmaq; yola salmaq; **to ~ *smb.* home** bir kəsi evə yola salmaq; *He got the child home O, uşağı evə apardı; I must get this home first Əvvəlcə mən bunu evə aparmalıyam*; **to ~ into** girmək, daxil olmaq, düşmək, keçmək; *I can't get into the house Mən evə girə bilmirəm; I can't get into the car Maşına girə bilmirəm; The whisky got into his head Viski onun başına vurdu*; **19.** satın almaq, əldə etmək; **to ~ *smth.* very cheap** bir şeyi çox ucuz almaq; **to ~ out of** çıxmaq; qalxmaq; düşmək; **to ~ out of a room** otaqdan çıxmaq; **to ~ out of a train** qatardan düşmək; **to ~ out of bed 1)** yataqdan durmaq/ qalxmaq; **2)** çıxmaq, canını qurtarmaq; **to ~ out of the wood** meşədən çıxmaq; **to ~ out of the rain** yağışdan daldalanmaq; **3)** rədd olub getmək; *Get out of my sight! Itil gözümdən!; Get out of my way! Çəkil yolumdan!;* **to ~ out of shape** formasını itirmək; **to ~ *smth.* out of *smb.*** bir şeyi bir kəsdən öyrənməyə çalışmaq, bir kəsdən söz çəkmək, bir kəsin ağzını aramaq; *I could get nothing out of him Mən ondan heç nə öyrənə bilmədim; They could get no money out of him Onlar ondan pul qopara bilmədilər;* **to ~ out of *smth.*** əl çəkmək, yaxa qurtarmaq; *You should get out of that bad habit Sən/Siz bu pis vərdişdən əl çəkməlisən/çəkməlisiniz;* **to ~ to do/doing/ *smth.*** bir şeyi etməyə başlamaq *(tanış olmaq, bilmək və s.); How did you get to know him? Sən/Siz onunla necə tanış oldun?/ oldunuz?; How did you get to know that I was here? Sən/Siz mənim burada olduğumu necə öyrəndin?/öyrəndiniz?;* **to ~ to be friends** dostlaşmaq; **to ~ talking** danışmağa başlamaq; **to ~ going** vüsət almaq; *Things haven't really got going yet Işlər hələ lazımınca geniş vüsət almayıb*; **1) to ~ *smb.* to do *smth.*** bir kəsi bir şey etməyə məcbur etmək/inandırmaq; **to ~ *smb.* to read** bir kəsi oxumağa məcbur etmək; **to ~ a man to speak** adamı danışmağa /çıxış etməyə inandırmaq; **to ~ *smb.* to listen to reason** bir kəsi ağılla hərəkət etməyə inandırmaq; *I got him to lend me £5 Mən onu dilə tutub 5 funt borc aldım; I cannot get anyone to do the work properly Mən bu işin lazımi qaydada edilməsinə nail ola bilmirəm;* **to ~ *smth.* to do *smth.*** bacarmaq, nail olmaq; *I got the tree to grow in a bad soil Mən yararsız torpaqda ağacı böyütməyə nail oldum; Can you get the door to shut? Sən / Siz elə edə bilərsənmi/bilərsinizmi ki, qapı örtülsün?;* **to ~ *smth.* done** etmək, görmək *(iş) (danışanın istəyi və ya göstərişi ilə icra edilən hərəkətlər haq.);* **to ~ *one's* hair cut** saçını vurdurmaq, başını qırxdırmaq; **to ~ *one's* coat mended** paltosunu təmir etdirmək / düzəltdirmək; **to ~ laws obeyed** qanunun gözlənilməsinə/yerinə yetirilməsinə nail olmaq; **to ~ into a state / a condition** müəyyən bir vəziyyətə/hala düşmək; **to ~ into trouble** fəlakətə/bəlaya düşmək; **to ~ into time-trouble** *şahm.* seytnota düşmək *(şahm. fikirləşmək üçün vaxtın olmaması);* **to ~ into a rage/a wax** qəzəblənmək, qeyzlənmək; **to ~ into touch with *smb.*** kiminləsə bilavasitə əlaqə yaratmaq; **to ~ into the habit of** vərdiş etmək; **to ~ *smth.* into a state** bir şeyi müəyyən bir vəziyyətə gətirmək; **to ~ *smth.* ready** bir şeyi hazırlamaq/hazır etmək; **to ~ the breakfast ready** səhər yeməyini hazırlamaq / hazır etmək; **to ~ the engine under way** maşını işə salmaq; **to ~ the work done** işi qurtarmaq; *Can you get the work finished in time? Sən/Siz işi vaxtında qurtara biləcəksənmi?/ biləcəksinizmi?;* **to ~ *one's* feet wet** ayaqlarını islatmaq; **to ~ *one's* hands dirty** əllərini batırmaq/ çirk etmək, bulamaq; **to ~ into clothes** geyinmək; *Get into your coat quickly! Tez paltonu gey! / geyin!; She got into an old dress O, köhnə paltarlarından birini əyninə taxdı; I couldn't get into the shoes Mən ayaqqabımı geyə bilmədim;* **to ~ over *smth.* 1)** keçmək, aşmaq, dırmaşıb keçmək; **to ~ over a fence** hasardan aşmaq; **to ~ over the road** yolu keçmək; **2)** öhdəsindən gəlmək, aradan qaldırmaq; **to ~ over the first difficulties** ilk çətinlikləri aradan qaldırmaq; **3)** özünə gəlmək, sağalmaq, düzəlmək; **to ~ over an illness** xəstəlikdən sonra özünə gəlmək / sağalmaq; **to ~ over a loss** itkidən sonra özünə gəlmək; **4)** öyrəşmək, alışmaq; dözmək; *I can't get over it Mən buna alışa bilmirəm*; **to ~ through to *smb.*** bir kəslə əlaqə saxlamaq, bir kəsə zəng edib cavab almaq; *When your note got through to me... Sənin/Sizin məktubun/məktubunuz mənə çatanda...;* **to ~ at *smb.* 1)** əlinə keçirmək, əlinə düşmək; *Just let me get at him Qoy o, bir əlimə düşsün;* **2)** çatmaq, yetişmək; *He was difficult to get at Onun yanına getmək çətin idi;* **3)** hücum etmək, üstünə düşmək; *Who are you getting at? Sən / Siz kimə hücum edirsən? / edirsiniz?;* **4)** ələ almaq *(rüşvətlə, pulla və s.); He has been got at Onu rüşvətlə ələ alıblar*; **to**



**~ to work** işə başlamaq; *Let's get to business Gəl / Gəlin işə başlayaq;* **to ~ down to *smth.*** bir şeylə ciddi məşğul olmaq; *I shall get down to this problem Mən bu məsələ ilə ciddi məşğul olacağam;* **to ~ round *smb.*** bir kəsi aldatmaq; *How did you get round him? Sən/Siz onu necə aldada bildin?/ bildiniz?; The girl knows how to get round him Qız onu necə tora salmağı bilir;* **to ~ in with *smb.*** bir kəslə yaxından tanış olmaq/dostlaşmaq; *I got in with them Mən onlarla yaxın dost oldum;* **to ~ off to a state** hər hansı bir vəziyyətə gəlmək; **to ~ off to sleep** yuxuya getmək; *He couldn't get off to sleep O, heç cür yuxuya gedə bilmirdi*; **to ~ *smb.* off** bir kəsi cəzadan qurtarmaq/xilas etmək; *His counsel got him off Onun vəkili onu cəzadan qurtardı; His youth got him off Onun gəncliyi onu xilas etdi*; **to ~ along /on/with *smth.*** bir şeylə keçinmək, dolanmaq; *I can get along with this sum of money Bu məbləğ pulla mən keçinə/dolana bilərəm;* **to ~ along/on/ by / without *smth.*** bir şeysiz dolanmaq/ keçinmək; **to ~ along without food** yeməksiz keçinmək; *We'll get along without your help Biz sənin / sizin köməyin / köməyiniz olmadan da keçinəcəyik;* **to ~ on to *smth.*** eşitmək, bilmək; *I got on to it quite by chance Mən bu haqda təsadüfən eşitdim;* **to ~ back at *smb.*** bir kəsdən qisas almaq; **to ~ *smth.* under** qarşısını almaq, yatırtmaq, söndürmək; **to ~ the revolt under** üsyanı yatırtmaq/söndürmək; *The revolt was got under Qiyam yatırıldı*; **to ~ *smth.* under control** bir şeyi nəzarətə götürmək/nəzarət altına almaq; **to have got** malik olmaq, var; *I have got little time Mənim az vaxtım var; I haven't got a penny Bir qəpiyim də yoxdur;* **to ~ aboard** minmək *(qatara, gəmiyə); We got aboard just as the train started moving Qatar tərpənəndə biz mindik*; **to ~ about 1)** yayılmaq; *The news got about that... Xəbər yayıldı ki...;* **2)** məlum olmaq; *It got about that... Məlum oldu ki...;* **3)** gedib-gəlmək, hərəkət etmək; *Trains and buses make it easy to get about Qatarlar və avtobuslar gediş-gəlişi asanlaşdırır; He is already getting about O, artıq hərəkət etməyə başlayıb (xəstəlikdən sonra);* **4)** müxtəlif yerlərdə olmaq, ora-bura getmək; *I don't get about much Mən demək olar ki, heç yerə getmirəm, Mən orda-burda çox olmuram;* **to ~ ahead 1)** uğur qazanmaq, irəli getmək; **2)** ötüb keçmək, arxada qoymaq; **to ~ ahead of all others** başqalarının hamısını ötüb keçmək; **to ~ along 1)** yaşamaq, dolanmaq, güzəran keçirmək; *They can only just get along on their small income Onlar öz cüzi gəlirləri ilə güclə dolana bilirlər; How are you getting along? Gün-güzəranınız necədir?; How are you? -Getting along! Necəsən? /Necəsiniz? -Bala-bala dolanırıq*; **2)** irəli/qabağa keçmək; *Get along! Keç /Keçin qabağa!;* **3)** yaxşı yola getmək, yaxşı münasibətdə olmaq; *We do not get along Biz yola getmirik;* **to ~ away** qaçıb getmək, qaçıb aradan çıxmaq, qaçmaq; *The prisoner got away Məhbus qaçıb aradan çıxdı; I want to get away from the city Mən şəhərdən çıxıb getmək istəyirəm*; **to ~ back 1)** qayıtmaq, geri dönmək; *When will you get back? Nə vaxt qayıdacaqsan? / qayıdacaqsınız?;* **2)** qaytarmaq, geri almaq; *How can I get back my book? Mən kitabımı necə geri ala bilərəm?;* **to ~ down 1)** düşmək, enmək; **to ~ down/off the ladder** nərdivandan düşmək; **to ~ down from *one's* horse 1)** atından düşmək; **2)** endirmək, düşürmək; **to ~ down a book from a shelf** kitabı rəfdən endirmək; **to ~ in 1)** daxil olmaq, girmək; *The car drove up and they got in Maşın yaxınlaşdı və onlar mindilər;* **2)** gəlmək, gəlib çıxmaq, varid olmaq, çatmaq; *The train gets in at 3 o'clock Qatar saat 3-də gəlir;* **3)** soxmaq, keçirmək; *I couldn't get the key in Mən açarı yerinə keçirə bilmədim;* **4)** toplamaq, yığmaq *(məhsulu); The farmers were busy getting in the crop Fermerlər məhsul yığımı ilə məşğul idilər*; **to ~ off 1)** düşmək, çıxmaq; *I'm getting off at the next stop Mən gələn dayanacaqda düşürəm/enirəm; Get off the grass! Otluqdan çıx! /çıxın! Otun üstündə gəzmə!/ gəzməyin!;* **2)** çıxarmaq, soyunmaq; *I can't get off my boots Mən ayaqqabılarımı çıxara bilmirəm;* **to ~ off stains** ləkələri aparmaq/ götürmək; **to ~ on 1)** minmək; *Here is your horse, get on! Bu da sənin/sizin atın /atınız, min!/minin!;* **2)** geyinmək; *Get your hat on! Papağını/Papağınızı başına/ başınıza qoy/qoyun!;* **3)** yaşlaşmaq, qocalmaq; *He is getting on for seventy Bu yaxınlarda onun 70 yaşı olacaq;* **4)** yaxınlaşmaq; *It is getting on for supper time Şam yeməyinin vaxtı yaxınlaşır;* **5)** yola getmək, arası saz olmaq; **to ~ on with people** camaatla yola getmək; *It is hard to get on with such a man Belə adamla yola getmək çətindir; We get on swimmingly Biz çox yaxşı yola gedirik, Bizim aramızdan su da keçməz;* **to ~ round** sağalmaq; *I'll get round somehow Bir təhər sağalacağam;* **to ~ through 1)** keçirmək; **to ~ a bill through Parliament** qanun layihəsini parlamentdən keçirmək; **2)** nəzərdən keçirmək, baxıb qurtarmaq; **to ~ through the letters** məktubları nəzərdən keçirmək; **3)** dözmək, davam gətirmək; *How shall I ever get through this? Mən bütün bunlara necə dözəcəyəm?;* **4)** imtahan vermək; *Did you get through the exam? Imtahanı verdinmi?/verdinizmi?;* **5)** telefonla əlaqə saxlamaq; *We got through at last Nəhayət ki, biz telefonla əlaqə saxladıq;* **to ~ together 1)** yığışmaq, toplaşmaq, görüşmək; *Let's get together one evening and talk about old times*

*Gəl/Gəlin bir axşam yığışıb keçmiş günlərdən söhbət edək;* 2) yığmaq, toplamaq; *The rebel leader could not get an army together Qiyamçı lider ordu toplaya bilmədi;* **to ~ one's thoughts together** fikrini toplamaq / cəm etmək; 3) razılığa gəlmək, ümumi dil tapmaq; *The jury was unable to get together Jüri üzvləri ümumi razılığa gələ bilmədilər;* **to ~ up** 1) yataqdan qalxmaq, yuxudan durmaq; *What time do you get up? Sən / Siz nə vaxt yataqdan qalxırsan?/qalxırsınız?;* 2) qaldırmaq, durğuzmaq; *Get the children up! Uşaqları qaldır!/qaldırın!;* 3) dırmaşmaq, qalxmaq; *He got up on to the roof O, dama dırmaşdı;* 4) artırmaq; *Get up the speed! Sürəti artır! /artırın!;* 5) təşkil etmək; **to ~ up a concert** konsert təşkil etmək; **to ~ up dance** bal/rəqs təşkil etmək; 6) bəzəmək, geyindirib-kecindirmək, qrimləmək; *They got her up as a Spanish dancer Onlar onu ispan rəqqasəsi kimi bəzəyib-düzədilər;* **to ~ oneself up** səliqəli geyinmək; *He was splendidly got up O, çox gözəl geyinmişdi;* 7) çox gözəl / əla vəziyyətə salmaq, qaydaya salmaq; *Have these shirts got up! Bu köynəkləri qaydaya sal!;* 8) güclənmək, qalxmaq; *The wind is getting up Külək qalxır/ güclənir;* 9) çatmaq, haqlamaq; *We got up to page seventeen last lesson Keçən dərs biz on yeddinci səhifəyə çatdıq; We soon got up to the others Tezliklə biz başqalarına çatdıq;*

◊ **to ~ to bed** yatmaq; **to ~ one's breath /wind** nəfəsini dərmək, özünə gəlmək; **to ~ wind of smth.** bir şeyi hiss etmək/ duymaq; **to ~ the wind up, to ~ cold feet** dizi əsmək, qorxmaq; **to ~ the upper hand** qalib/üstün gəlmək; **to ~ into smb.'s confidence** bir kəsin qılığına girmək/etimadını qazanmaq; **to ~ smth. off one's chest** ürəyini boşaltmaq, hər şeyi boynuna almaq; **to ~ into a mess / into a muddle/into a scrape/into hot water** işə düşmək, bəlaya düçar olmaq, çıxılmaz vəziyyətə düşmək, ilişmək; **to ~ into deep waters** qorxulu/çıxılmaz vəziyyətdə olmaq, dara düşmək; **to ~ on smb.'s nerves, to ~ under smb.'s skin** bir kəsin əsəbləri ilə oynamaq, bir kəsi əsəbiləşdirmək/acıqlandırmaq; **to ~ smb.'s back up, to ~ smb.'s goat** bir kəsi özündən çıxartmaq/qəzəbləndirmək/hirsləndirmək; **to ~ one's blood/dander up** özündən çıxmaq, qızışmaq, qızmaq, hiddətlənmək, hirslənmək; cin atına minmək; *He got the girl's dander up O, qızı özündən çıxardı;* **to ~ back one's own, to ~ one's own back** qisas almaq, qanı yerdə qoymamaq, qanını almaq; **to ~ even with smb.** bir kəslə hesabı çürütmək, əvəzini çıxmaq, intiqam almaq; **to ~ hell, to ~ it, to ~ it hot, to ~ it in the neck, to ~ a rap on/over/the knuckles** abrını ətəyinə bükmək/vermək, həddini qandırmaq, yaxşı dərs vermək, qulaqburması vermək, qapaz vurmaq; **to ~ rid of smb./ smth.** bir kəsdən/şeydən yaxa qurtarmaq; **to ~ the mitten/the sack/the push/the gate** işdən azad edilmək/qovulmaq/rədd cavabı almaq; **to ~ the boot/the kick** işdən qovulmaq, dalına dəyib qovulmaq; **to ~ the bird** xoruzunu/quşunu qoltuğuna vermək, fitə basılmaq; **to ~ the big bird/the raspberry** sürəkli alqışlarla qarşılanmaq; **to ~ one's hand in it, to ~ the hang /the feel/ of it** təcrübə qazanmaq, mahirləşmək, ustalaşmaq, əli yatmaq; **to ~ home** *məc.* öz məqsədinə nail olmaq; muradına yetişmək/çatmaq; **to ~ down to brass tacks** 1) əsas mətləbə keçmək; 2) bir şeyə olduğu kimi baxmaq; **to ~ with child** hamilə etmək, qarnına uşaq qoymaq; *Get off it! Bəsdir, qurtar!, Bəsdir, yetər!*

**getatable** [get'ætəbl] *adj* keçilə bilən, əlçatan, mümkün

**get-away** ['getə'weı] *n d.d.* 1. qaçma, aradan çıxma; **to make a ~** qaçmaq, qaçıb aradan çıxmaq; 2. *id.* start

**get-rich-quick** ['getrıtʃ'kwık] *n d.d.* çox sürətlə varlanmağa can atan adam

**getter** ['getə(r)] *n* 1. alan, əldə edən, alıcı; 2. qazanc düşkünü; 3. qazmaçı; 4. döllük, damazlıq *(buğa, qoç, ayğır və s.)*

**get-together** ['gettə,geðə(r)] *n* 1. qeyri-rəsmi müşavirə; 2. görüş; 3. axşam qonaqlığı, əyləncə gecəsi

**gewgaw[1]** ['gju:gɔ:] *n* bəzək-düzək, zahiri bəzək, bərbəzək

**gewgaw[2]** ['gju:gɔ:] *adj* saxta, yalançı, zahiri, saxta, ancaq parıltılı

**geyser** ['gaızə(r), 'gi:zə(r)] *n* I geyzer *(fasilələrlə fontan vuran isti bulaq)*

**geyser** ['gi:zə(r)] *n* II qaz kolonkası *(su qızdırmaq üçün)*

**ghastly[1]** ['ga:stlı] *adj* 1. qorxulu; dəhşətli; **~ accident** dəhşətli qəza/fəlakət; **~ murder** dəhşətli qətl; **~ dreams** qorxulu yuxu, qarabasma; 2. cansız, ölü kimi, meyitsifət; **~ grin** ölü sifəti

**ghastly[2]** ['ga:stlı] *adv* son dərəcə, olduqca, həddindən artıq; *She has ghastly bad taste Onun olduqca pis zövqü var*

**ghee** [gi:] *n* ərinmiş/sarı yağ *(camış südündən)*

**ghetto** ['getou] *n (pl -os [-ouz])* getto *(orta əsrlərdə yəhudi məhəlləsi; bəzi ölkələrdə zəncilərin və ya dini azlıqların yaşadıqları məhəllələr)*

**ghost[1]** [goust] *n* 1. xəyal, qarabasma, kabus, kölgə; **the ~ of Hamlet's father** Hamletin atasının kölgəsi/kabusu; *I don't believe in ghosts Mən kabuslara inanmıram; He looked as if he had seen a ghost O sanki kabus görmüş kimi dəhşətli bir görkəm almışdı;* 2. can, ruh; **to give up the ~** *arx.* canı çıxmaq, canını bağışlamaq, ölmək; 3. iz, əsər, əlamət; **~s of the past** keçmişin izləri; **Holly Ghost** müqəddəs ruh; 4. başqası üçün yazan müəllif; **~ writer** adsız/naməlum yazıçı; **not to have the ~ of a chance** iynənin ucu qədər də gümanı olmamaq;

◊ **as white as a ~** ölü kimi ağappaq, ölü sifəti kimi



**ghost[2]** [goust] *v* 1. kölgə/kabus kimi izləmək; 2. başqası üçün yazmaq / yaratmaq; *His memories have been very ably ghosted Onun xatirələrini kimsə çox ustalıqla/ gözəl yazıb*

**ghost-dance** ['goustda:ns] *n* dəfn mərasimi rəqsi *(Şimali Amerika hindularının mərhumun ruhuna həsr etdikləri rəqslər)*

**ghostly** ['goustlı] *adj* 1. kabusa bənzər, xəyali; 2. mənəvi; **~ father** keşiş; **~ comfort** mənəvi təskinlik, təsəlli

**ghoul** [gu:l] *n* 1. qulyabanı, xortdan; 2. qəbiristan oğrusu

**ghoulish** ['gu:lıʃ] *adj* iyrənc, pis, mənfur, çirkin

**GI[1]** ['dʒı:'aı] *n* amerikan əsgəri; **~ Bill of Right** ordudan tərxis edilmiş əsgərlərə verilən güzəştlər/imtiyazlar; **~ morale** əsgərlərin mənəvi ruh yüksəkliyi; **~ bride** Ingiltərəli gəlin, amerikan əsgərinin arvadı

**GI[2]** ['dʒı:'aı] *adj* 1. dövləti, rəsmi, hərbi formalı; 2. əsgər, əsgəri; **~ hair-cut** əsgəri qaydada qırxılmış saç / baş

**GI[3]** ['dʒı:'aı] *v* kazarmanı silib süpürmək, təmizləmək

**giant[1]** ['dʒaıənt] *n* 1. giqant, nəhəng, azman, pəhləvan; 2. div *(əsatirlərdə vuruşan)*; 3. nəhəng, giqant *(şəxs haq.)*

**giant[2]** ['dʒaıənt] *adj* nəhəng, çox böyük; **~ cabbage** çox böyük kələm; **~ planets** böyük planetlər *(Yupiter, Saturn, Uran, Neptun)*

**giantess** ['dʒaıəntıs] *n* nəhəng qadın

**giantism** ['dʒaıəntızm] *n* giqantizm, nəhənglik, nəhəng boy/boy-buxun

**giantlike** ['dʒaıəntlaık] *adj* nəhəng, nəhəng kimi, nəhəngəbənzər

**giant-powder** ['dʒaıənt.paudə(r)] *n* dinamitin bir növü

**giaour** ['dʒauə(r)] *n* kafir, gavur

**gib** [gıb] *n* I 1. pişik; 2. axta pişik; 3. küpəgirən qarı

**gib** [dʒıb] *n* II *tex.* dəmirbənd, pərçim, paz; **~ arm = gibbet[1]**

**gib-and-cotter** ['dʒıbən'kɔtə(r)] *n* ikiqat paz

**gibber[1]** ['dʒıbə(r)] *n* anlaşılmaz/aydın olmayan nitq

**gibber[2]** ['dʒıbə(r)] *v* anlaşılmaz bir surətdə danışmaq, aydın danışmamaq

**gibbet[1]** ['dʒıbıt] *n* 1. dar ağacı; **to die on the ~** edam olunmaq, dar ağacından asılmaq; 2. dara çəkmə; 3. *tex.* qaldırıcı kranın hərəkət edən hissəsi

**gibbet[2]** ['dʒıbıt] *v* 1. asmaq, edam etmək; 2. rüsvay etmək; araya /oyuncaq yerinə qoymaq; **to be ~ed in the press** mətbuatda rüsvay edilmək

**gibbon** ['gıbən] *n zool.* gibbon *(insanabənzər uzunqollu meymun).*

**gibbosity** [gı'bɔsıtı] *n* 1. qozbellik, donqarlıq; qoz, donqar *(beldə, burunda)*; 2. qabarıqlıq, qabarıq *(yer)*; çıxıntı

**gibbous** ['gıbəs] *adj* 1. qozbel, donqar; 2. qabarıq

**gibe[1]** [dʒaıb] *n* istehza, masqara, lağa qoyma, rişxənd; **the ~s of the crowd** camaatın rişxəndləri

**gibe[2]** [dʒaıb] *v* ələ salmaq, lağa qoymaq, rişxənd etmək; **to ~ at smb.'s mistakes** kiminsə səhvlərini lağa qoymaq

**giber** ['dʒaıbə(r)] *n* adamoynadan, adam ələ salan, rişxəndçi, masqaraçı

**giblets** ['dʒıblıts] *n pl* qazın içalatı

**gibus** ['dʒaıbəs] *n* şapoklyak *(yaylı qatlama şlyapa)*

**giddily** ['gıdılı] *adv* 1. heç nə düşünmədən, heç nə başa düşmədən/dərk etmədən, yüngül-yüngül; 2. dəli kimi, hövlnak, əlimyandı; 3. başgicəlləndirən

**giddiness** ['gıdınıs] *n* 1. başgicəllənmə; **to feel / to be seized with ~** başgicəllənmə hiss etmək; *I am given to giddiness Məndə tez-tez başgicəllənmə olur;* 2. yüngüllük, yelbeyinlik, hərdəmxəyallıq, dəlisovluq, dəlilik, dəmdəməkilik

**giddy** ['gıdı] *adj* 1. başgicəllənməyə mübtəla olan; *I feel / am giddy Başım gicəllənir; He turned/got giddy Onun başı gicəlləndi; If you turn round quickly fifty times, you will feel giddy Əgər sən/siz əlli dəfə sürətlə fırlansan/fırlansanız, başın/başınız gicəllənər;* **~ with success** müvəffəqiyyətdən/uğurdan başı gicəllənən; 2. başgicəlləndirici; **~ height** başgicəlləndirici hündürlük / yüksəklik; 3. yüngülxasiyyət, dəmdəməki, yelbeyin, yüngül, arsız; **a ~ young girl** yüngülxasiyyət cavan qız; *Her conduct was rather giddy O özünü olduqca yüngül apardı;*

◊ *That's the giddy limit! Bu lap ağ oldu!* **to play the ~ goat** 1) gic-gic zarafat etmək, şitini çıxarmaq; 2) olduqca arsız bir həyat sürmək

**gift[1]** [gıft] *n* 1. hədiyyə, bəxşiş, sovqat; **birthday ~** ad/doğum günü hədiyyəsi; **to make a ~** hədiyyə etmək/vermək; *I would not take /have it as a gift Mən onu havayı/müftə də olsa götürmərəm;* 2. bacarıq, qabiliyyət, zəka, fitri istedad; **to have a ~ for music/languages** musiqi istedadına/dilləri mənimsəmə qabiliyyətinə malik olmaq; **the ~ of (the) gab** nitq/söz qabiliyyəti/ pərgarlığı; **to be a man of great ~s** çox istedadlı adam olmaq; **to turn one's ~ to account** öz istedadından istifadə etmək/bəhrələnmək;

◊ **Indian ~** *qaytarılması və ya əvəzi ödənilməsi nəzərdə tutulan hədiyyə;*

◊ *Don't look a gift horse in the mouth at. söz. Bəy verən atın dişinə baxmazlar*

**gift[2]** [gıft] *v* hədiyyə vermək, bağışlamaq, bəxş etmək; *He was gifted by nature with great talent Təbiət ona müstəsna bir istedad bəxş edib*

**gifted** ['gıftıd] *adj* bacarıqlı, zəkalı, istedadlı, çox

qabiliyyətli; a ~ **poet/painter** istedadlı şair/rəssam

**gig**[1] [gɪg] *n* I **1.** kabriolet *(1) təkatlı, ikitəkərli, birnəfərlik yüngül minik arabası; 2) üstü açılan minik avtomobili)*; **2.** giçka *(iti gedən yüngül qayıq)*; **3.** motorlu kater *(komandirin kateri)*; **4.** bucurqad/lebyodka *(ağırlıq qaldıran mexanizm)*

**gig** [gɪg] *n* II **1.** fırfıra, fırlanğıc; **2.** *arx.* yüngül/dəmdəməki qız

**gig** [gɪg] *n* III çəngəl *(balıq tutmaq üçün yaba şəklində alət)*

**gig**[2] [gɪg] *v* I çəngəllə balıq tutmaq

**gig** [gɪg] *v* II xov vermək, xovlamaq

**gigantic** [dʒaɪ'gæntɪk] *adj* nəhəng, çox böyük, azman, çox iri; *He has a gigantic appetite Onun çox böyük iştahası var*

**giggle**[1] ['gɪgl] *n* istehza ilə gülmə, bığaltı gülmə, hırtıldama, hırıltı; **to burst into ~s** hırıldamaq, istehza ilə gülmək

**giggle**[2] ['gɪgl] *v* irişmək, hırtıldamaq, hırıldamaq, pıqqıldamaq; **to ~ loudly** bərkdən hırıldamaq; *She giggled her appreciation of my silly joke O mənim zarafatımı təqdir edirmiş kimi irişdi*

**gig-lamps** ['gɪglæmps] *n zaraf.* eynək

**gig-lamped** ['gɪglæmpt] *adj* eynəkli, eynək geyən; **a ~ young man** eynəkli cavan oğlan

**gigmanity** [gɪg'mænɪtɪ] *n* meşşan *(ictimai görüş dairəsi olmayan və öz şəxsi mənafeyi ilə yaşayan adam)*

**GI Jane** ['dʒi:'aɪ'dʒeɪn] *n amer.* əsgər-qadın

**GI Joe** ['dʒi:'aɪ'dʒou] *n* = **GI**[1]

**gild** [gɪld] *v* **1.** qızıl suyuna salmaq, qızıl suyu vermək, zərləmək; *The sun gilded the hill-tops şair. Günəş təpələrin başını qızılı rəngə boyadı;* **2.** bəzəmək;

◊ **to ~ the lily, to ~ refined gold** ≅ boş yerə vaxt itirmək, boş/mənasız işlə məşğul olmaq

**gilded** ['gɪldɪd] *adj* qızıl suyuna salınmış;

◊ **Gilded Chamber** Lordlar Palatası; **~ youth** moda və var-dövlət düşkünü olan gənclər

**gilder** ['gɪldə^r] *n* zərgər; **carver and ~** oyma və süsləmə ustası

**gilding** ['gɪldɪŋ] *n* **1.** qızıl suyu, zər; **2.** qızıl suyuna salma /çəkmə; zərləmə

**gill**[1] [gɪl] *n* I **1.** qəlsəmə *(suda yaşayan heyvanların tənəffüs orqanı)*; **2.** saqqal *(xoruzda)*; **3.** buxaq; **4.** göbələyin alt hissəsindəki çoxlu şaquli qatlar;

◊ **to be/to look rosy about the ~s** sağlam olmaq/görünmək; **to be white about the ~s** qorxmaq, hürkmək; **to grease the ~s** doyunca yemək; **full to the ~** *amer.* lül qənbər/sərxoş

**gill** [gɪl] *n* II **1.** dərin/meşəli/kiçik çay axan yarğanlar; **2.** dağdan axan çay

**gill**[2] [gɪl] *v* **1.** balığın içalatını təmizləmək; **2.** torla balıq tutmaq; **3.** göbələk təmizləmək

**gillyflower** ['dʒɪlɪ.flauə^r] *n bot.* şəbbu, şəbbugülü

**gilt**[1] [gɪlt] *n* I **1.** qızıl suyu, zər; **2.** *d.d.* qızıl; pul;

◊ **to take the ~ off the gingerbread 1)** bir şeyi olduğu kimi göstərmək; **2)** bir şeyi yaraşıqdan məhrum etmək; **3)** bir şey haqqındakı xəyalları puç etmək

**gilt** [gɪlt] *n* II çoşka *(4-10 aylıq donuz balası)*

**gilt**[2] [gɪlt] *adj* qızıl suyuna çəkilmiş, zərlənmiş; **2.** = **gilt-edged**

**gilt**[3] [gɪlt] to **gild** *felinin pp, pt formaları*

**gilt-edged** ['gɪltedʒd] *adj* **1.** qızılı kənarlı/ qıraqlı *(kitab və s.)*; **2.** *d.d.* ən yaxşı, əla; *He gave the girl a gilt-edged tip O, qıza çox yaxşı məsləhət verdi;* **~ stocks/securities** dövlət təminatlı /qiymətli kağızlar

**gimbal-joint** ['dʒɪmbəl'dʒɔɪnt] *n* = **gimbals**

**gimbals** ['dʒɪmbəlz] *n (özündən sonra fel cəmdə işlənir) tex.* universal şarnir, həncamə

**gimcrack**[1] ['dʒɪmkræk] *n* saxta bərbəzək, bəzəkdüzək

**gimcrack**[2] ['dʒɪmkræk] *adj* saxta, zahiri, yalançı; əldəqayırma, pis düzəldilmiş

**gimlet**[1] ['gɪmlɪt] *n* burğu, matqab; **eyes like ~s** iti gözlər

**gimlet**[2] ['gɪmlɪt] *v* burğu/matqab ilə deşmək / deşik açmaq

**gimmick** ['gɪmɪk] *n* **1.** çox incə/məharətlə düzəldilmiş mexanizm; **2.** kələk, hoqqa, oyun, biclik; **to find the ~** kələyin/bicliyin üstünü açmaq; **to pull a ~** ələ salmaq, dolamaq, hoqqa çıxarmaq; aldatmaq

**gimp** [gɪmp] *n* **1.** güləbətin, bafta ipliyi; **2.** *krujevada naxışların seçilməsi üçün istifadə olunan yoğun sap*

**gin**[1] [dʒɪn] *n* I cin *(ingilis arağı)*

**gin** [dʒɪn] *n* II **1.** bucurqad *(ağırlıq qaldıran mexanizm)*; **2.** şkiv *(intiqal qayışını hərəkətə gətirən çarx)*; **3.** quyu çarxı, dolamaçarx; **4.:** **cotton ~** pambığı çiyiddən ayıran maşın

**gin**[2] [dʒɪn] *v* **1.** tələ ilə/torla/duzaqla tutmaq; **2.** pambığı maşınla çiyiddən ayırmaq

**gin-drinker's liver** ['dʒɪn'drɪŋkəz'lɪvə^r] *n* qaraciyər sərrozu *(əyyaşlarda)*

**ginger**[1] ['dʒɪndʒə^r, dʒɪnʒə^r] *n* **1.** *bot.* zəncəfil; **2.** zəncəfil *(ədviyyat)*; **3.** *məc.* həvəs, yüksək əhvalruhiyyə, canlanma; **to put some ~ into it** həvəslə işləmək; **4.** şirinlik, cazibəlilik, zəriflik, duzluluq; *The book lacks ginger Kitab oxunaqlı deyil;*

◊ **~ group** *hökuməti daha aktiv olmağa təhrik edən parlament qrupu; By ginger! Lənətə gələsən!, Lənət sənə!, Lənət şeytana!*

**ginger**[2] ['dʒɪndʒə^r] *v* **1.** zəncəfil əlavə etmək / vurmaq; **2.** qamçılamaq, şallaqlamaq, mahmızlamaq *(atı)*; **to ~ up** canlandırmaq, ürəkləndirmək, hərəkətə gətirmək; **to ~ smb. up** bir kəsi ürəkləndirmək; **to ~ up a scene** səhnəni canlandırmaq *(teatrda)*

**ginger-ale** ['dʒɪndʒə^r'eɪl] *n* zəncəfilli pivə / abco *(spirtsiz)*



**ginger-beer** ['dʒɪndʒə'bɪə^r] *n* zəncəfilli limonad / pivə

**gingerbread** ['dʒɪndʒəbred] *n* **1.** zəncəfilli pryanik, kovrijka; **2.** saxta/ucuz təmtəraq / dəbdəbə

**gingerbread-nut** ['dʒɪndʒəbred'nʌt] *n* zəncəfilli peçenye

**ginger-hair** ['dʒɪndʒə'heə^r] *n* kürən saç

**gingerly**[1] ['dʒɪndʒəlɪ] *adj* **1.** ehtiyatlı, sayıq; **2.** ağciyər; **in a ~ manner** ehtiyatla, qorxa-qorxa

**gingerly**[2] ['dʒɪndʒəlɪ] *adv* ehtiyatla, ehmalla, ehmalca, qorxa-qorxa; **to walk ~** ehtiyatla yerimək

**gingery** ['dʒɪndʒərɪ] *adj* **1.** zəncəfil; zəncəfilli; **2.** kürən; **3.** tündməcaz, tezacıqlanan

**gingham** ['gɪŋəm] *n* **1.** toxunma zolaqlı və ya dama-dama pambıq/kətan parça; **2.** böyük çətir / şəmsiyyə

**gingili oil** ['dʒɪndʒɪlɪ'ɔɪl] *n* küncüt yağı

**gingiva** [dʒɪn'dʒaɪvə] *n (pl* **-vae***) anat.* diş əti

**gingivitis** ['dʒɪndʒɪ'vaɪtɪs] *n tib.* gingivit *(diş ətinin iltihabı)*

**gink** [gɪŋk] *n d.d.* qəribə/əcaib/tühaf oğlan

**gin-liver** ['dʒɪn'lɪvə^r] *n* = **gin drinker's liver**

**gin-mill** ['dʒɪnmɪl] *n* pivəxana

**ginnery** ['dʒɪnərɪ] *n* pambıqtəmizləmə zavodu

**ginny** ['dʒɪnɪ] *adj* sərxoş; **to get ~** sərxoş olmaq, keflənmək

**ginseng** ['dʒɪnseŋ] *n bot.* jenşen

**gin-shop** ['dʒɪnʃɔp] *n* = **gin-mill**

**gin-sling** ['dʒɪnslɪŋ] *n* şirinləşdirilmiş ədviyyalı cin *(spirtli içki növü)*

**Gippo** ['dʒɪpou] *n* **1.** misirli; **2.** qaraçı

**gippo**[1] ['dʒɪpou] *n* **1.** *hərb. sl.* **1.** şorba; duru xörək; horra; **2.** xörək şirəsi, sous; ət sousu

**gippo**[2] ['dʒɪpou] *v* yağ / su əlavə etmək *(xörək bişirən zaman)*

**gippy** ['dʒɪpɪ] *n sl.* Misir əsgəri

**Gipsy**[1] ['dʒɪpsɪ] *n* **1.** qaraçı, sıqan; **2.** qaraçı dili

**Gipsy**[2] ['dʒɪpsɪ] *adj* qaraçı, sıqan

**Gipsy**[3] ['dʒɪpsɪ] *v* **1.** köçəri həyat sürmək; **2.** qaraçı/sıqan kimi yaşamaq; **3.** seyrə / seyrana çıxmaq

**Gipsy caravan** ['dʒɪpsɪ.kærə'væn] *n* üstüörtülü qaraçı arabası

**Gipsy-cart** ['dʒɪpsɪ'ka:t] *n* = **Gipsy caravan**

**gipsy-table** ['dʒɪpsɪ.teɪbl] *n* üçayaqlı masa / stol

**giraffe** [dʒɪ'ra:f] *n zool.* zürafə

**girandole** ['dʒɪrəndoul] *n* **1.** böyük şamdan; **2.** atəşfəşanlıq / atəşbazlıq çarxı

**gird**[1] [gə:d] *n arx.* istehza, masqara, ələsalma, rişxənd

**gird**[2] [gə:d] *v* I **(at)** ələ salmaq, rişxənd etmək

**gird** [gə:d] *v* II *(pt, pp* **girded** [-ɪd] *və ya* **girt**) **1.** qurşamaq, bağlamaq *(qayış)*; **2.** qurşanmaq, qayışını bağlamaq; *He was girt about with rope O, belini kəndirlə bağlamışdı;* **3.** *(belinə)* bağlamaq; **to ~ on a sword** *(belinə)* qılınc bağlamaq; **4.** əhatə etmək, dövrələmək; **an island ~ed by the sea** dənizlə əhatə olunmuş ada; *They girded the camp with a ditch Onlar düşərgəni xəndəklə əhatəyə aldılar;* **5.** vermək *(səlahiyyət, hakimiyyət, ixtiyar)*; **to ~ smb. with authority/power** bir kəsə səlahiyyət /hakimiyyət vermək;

◊ **to ~ (up)** *one's* **loins 1)** *bibl.* belini sarımaq; **2)** gücünü toplamaq; ciddi addım atmağa hazırlaşmaq/hazır olmaq; **to ~ oneself for** *smth.* özünü bir şeyə hazırlamaq

**girder** ['gə:də^r] *n* **1.** tir, dirək; **2.** körpü çatısı, ana dirək, dayaq tiri

**girdle**[1] ['gə:dl] *n* **1.** toqqa, qayış; **2.** *tex.* çənbər, qurşaq, kəmər; **3.** *anat.* bel, qurşaq; **4.** *coğ.* qurşaq; iqlim qurşağı;

◊ **the ~ of the world** *arx.* ekvator; **to have/ to hold / to keep** *smb.* **under** *one's* ~ bir kəsi öz itaəti altında saxlamaq

**girdle**[2] ['gə:dl] *v* **1.** qurşaqlamaq, kəmərləmək; kəmər bağlamaq; **2.** əhatə etmək, dövrələmək; araya almaq; *(həm də* **~in/ about/round***)*; **the hills that ~ in the town/the hills that ~ the town about** şəhəri əhatə edən / dövrəyə alan təpələr; **3.** *ziyanvericilərdən qorumaq üçün ağacların gövdəsinə halqavarı qətran və s. sürtmək;*

◊ **like a hen on a hot ~** iynə üstündə *(oturmaq)*

**girl** [gə:l] *n* **1.** qız, qız uşağı; **2.** cavan / yetişmiş qız; **3.** cavan qadın; **4.** xidmətçi qız; **5.** satıcı qız; **6.** nişanlı / adaxlı qız; sevgili; *He is off to see his girl O öz sevgilisi ilə görüşməyə gedib*

**girl-friend** ['gə:lfrend] *n* **1.** rəfiqə; **2.** sevgili, canan

**girlhood** ['gə:lhud] *n* qızlıq, qızlıq dövrü

**girlie** ['gə:lɪ] *n* **1.** qızcığaz; **2.** xorda çıxış edən qız; **~ magazine** qadınlar üçün jurnal

**girlish** ['gə:lɪʃ] *adj* qızsayağı, nərmənazik, qız kimi *(oğlan haq.)*; **~ games** qız oyunları; **~ laughter** qızsayağı gülüş, qız gülüşü

**girlishness** ['gə:lɪʃnɪs] *n* **1.** qız ədaları, qız rəftarı; **2.** nərmənaziklik

**girt** [gə:t] **gird** *felinin pt və pp formaları*

**girth**[1] [gə:θ] *n* **1.** qarınaltı, tapqır *(yəhərdə)*; **2.** qucaq, qucum *(ağacın, belin və s. dairəsi)*; **a tree 30 feet in ~** gövdəsi / dairəsi 30 fut qucum olan ağac

**girth**[2] [gə:θ] *v* **1.** qarınaltını/tapqırı bərkitmək; **2.** qucaqla ölçmək; **3.** sarımaq, dolamaq *(qayışı)*

**gise** [dʒaɪs] *v d.d.* otarmaq *(hər baş mal üçün muzd ödənilməsi şərtilə)*

**gisement** ['dʒaɪzmənt] *n* **1.** muzdla otarılan mal-qara; **2.** mal-qaranın otarılması üçün alınan pul/ muzd

**gist** [dʒɪst] *n* **1.** mahiyyət, məğz, əsas mətləb; **the ~ of the matter** işin məğzi/ mahiyyəti; *Tell me the gist of what he said Onun dediyinin əsas mahiyyətini mənə danış/danışın;* **2.** *hüq.* ittihamın/müqavilənin əsas hissəsi/məğzi/mahiyyəti

**gith** [gɪθ] *n bot.* **1.** qaraçörəkotu; **2.** qara göbələk

**give¹** [gɪv] *n* **1.** elastiklik qabiliyyəti, elastiklik, asanlıqla yumşalma, yumşaqlıq; genəlmə *(parça haq.)*; **the apparent ~ in the weather** havanın xeyli yumşalması; *A stone floor has no give in it Daş döşəmənin yumşaqlığı / elastikliyi yoxdur; There is no give in this cloth Bu parça genəlmir;* **2.** tez təsir altına düşmə, yolayovuqluq, güzəşt, üzüyolalıq; *There is no give in him Onda güzəşt yoxdur, O, güzəştə getmir;*
◊ **~ and take 1)** qarşılıqlı güzəşt, kompromis; *There must be give and take if the negotiations to settle an industrial dispute are to succeed İstehsalat məsələsində fikir ayrılığını aradan qaldırmağa nail olmaq üçün danışıqlarda qarşılıqlı güzəşt olmalıdır;* **2)** fikir mübadiləsi, lütfkarlıq göstərmə

**give²** [gɪv] *v (pt* **gave**, *pp* **given) 1.** vermək; *I gave Nijat a book Mən Nicata kitab verdim; I gave a book to each of the boys Mən oğlanların hərəsinə bir kitab verdim; Each of the boys was given a book Oğlanlardan hər birinə bir kitab verildi; A book was given to each of them Onların hər birinə kitab verildi; Give me one Mənə bir dənə ver/verin; Give one to me Birini mənə ver /verin; Give me a day to think Fikirləşmək üçün mənə bir gün vaxt ver/verin;* **to ~ lessons** dərs keçmək/ vermək; **to ~ *one's* word** söz vermək; **to ~ *smb.* to eat** bir kəsə yemək vermək; **to ~ *smb.* to drink** bir kəsə su/içki vermək; **to ~ *smb.* a present** bir kəsə hədiyyə vermək; **to ~ *smth.* as a keepsake** bir şeyi yadigar olaraq vermək / bağışlamaq; *I don't know what to give her for her birthday Doğum/Ad günü üçün ona nə verəcəyimi bilmirəm; He gave all his books to the library O, bütün kitablarını kitabxanaya verdi;* **to ~ a medal** medal vermək; **to ~ alms** ianə vermək; *Give us liberty or give us death! Ya bizə azadlıq verin, ya da öldürün!;* **2.** yetirmək, göndərmək; **to ~ regards** salam göndərmək; *He gives you his best regards O, xoş arzularını / salamını sənə / sizə yetirir;* **3.** vəsiyyət etmək; **to ~ *smb. smth.* in *one's* will** bir kəsə nəyisə vəsiyyət etmək; **4.** yoluxdurmaq; *You have given me your cold in the nose Sən məni qripinlə yoluxdurmusan;* **5.** vermək, ödəmək; *I gave ten shillings for the hat Mən bu şlyapaya 10 şillinq verdim;* **6.** yer vermək; **to ~ *smb.* the place of honour** bir kəsi fəxri yerdə əyləşdirmək; **to ~ *smb.* his due** bir kəsi öz xidmətinə /layaqətinə görə qiymətləndirmək; **to ~ a cry** qışqırmaq; **to ~ a look** nəzər salmaq; **to ~ a jump** tullanmaq; **to ~ a loud laugh** ucadan gülmək; **to ~ encouragement** ürək-dirək vermək, təqdir etmək; **to ~ permission** icazə vermək; **to ~ an order** əmr vermək; **to ~ birth** doğmaq, həyat vermək; **to ~ thought to *smth.*** bir şey barəsində düşünmək/fikirləşmək; **to ~ chase** izləmək, təqib etmək; **7.** yetirmək, vermək, həsr etmək; **to ~ *one's* attention to** diqqət vermək / yetirmək; **to ~ *one's* mind to study** özünü təhsilə həsr etmək; **to ~ dinner** nahar yeməyi vermək; **to ~ a party** qonaqlıq vermək; **8.** səbəb olmaq, ziyan/zərər vurmaq /vermək; *It gave me much pain Bu mənə çox əziyyət verdi; The pupils give much trouble Şagirdlər (müəllimə) çox əziyyət verirlər;* **9.** hamıya bildirmək/məlumat vermək; göstərmək; **to ~ to the world** hamıya bildirmək, aləmə yaymaq; **to ~ evidence** ifadə vermək; *It was given in the newspaper Bu haqda qəzetdə məlumat verildi; The thermometer gives 25° in the shade Termometr kölgədə 25° göstərir;* **10.** məhkum etmək, iş vermək; *The court gave him six months hard labour Məhkəmə ona altı aylıq ağır icbari iş verdi;* **11.** güzəştə getmək, razılaşmaq; *I give you that point Bu məsələdə mən səninlə / sizinlə razılaşıram;* **to ~ ground, to ~ way** geri çəkilmək, tabe olmaq, tab gətirməmək; *Our troops had to give way Ordumuz geri çəkilməli oldu; The ice gave way and we all went through into the water Buz tab gətirmədi və biz hamımız suya düşdük; The rope gave way Kəndir tab gətirməyib qırıldı;* **12.** əyilmək; *The branch gave, but did not break Budaq əyildi, ancaq sınmadı;* **13.** korlanmaq *(səhhət haq.)*; **14.** ifa etmək, çalmaq; *Give us Chopin Bizə Şopeni çal / çalın;* **15.** çıxmaq, baxmaq *(həm də ~* **into/ upon**) *(pəncərə, koridor haq.); The door gave into the park Qapı parka çıxırdı;* **to ~ *smb.* away** bir kəsi təhvil vermək; *The bride was given away by her father Gəlini bəyə qızın atası təhvil verdi (toyda);* **to ~ *smth.* away 1)** bir şeyi əldən vermək/buraxmaq/qaçırmaq; *You've given away a good chance of winning the match Sən / Siz yarışı udmaq üçün yaxşı imkanı əldən verdin/verdiniz;* **2)** paylamaq; *He came to give away the prizes O, mükafatları/prizləri təqdim etmək / paylamaq üçün gəldi; He gave away all his money O, bütün pullarını payladı;* **3)** açmaq, məlum etmək, sirrini faş etmək, büruzə vermək; *Don't give away my secrets Mənim sirlərimin üstünü açma/açmayın; His accent gave him away Onun ləhcəsi onun kim olduğunu büruzə verdi;* **to ~ back** qaytarmaq, bərpa etmək; **to ~ a thing back to its rightful owner** bir şeyi öz qanuni sahibinə qaytarmaq; **to ~ a man back his liberty** bir adamın azadlığını özünə qaytarmaq; **to ~ in 1)** tabe/təslim olmaq; güzəştə getmək, etiraf etmək; *The rebels were forced to give in Qiyamçıları təslim olmağa məcbur etdilər; I give in! Mən təslim!; He has given in to my views O mənim baxışlarımın / nöqteyi-nəzərlərimin düzgünlüyünü etiraf etdi; Mary usually has to give in to her big brother Meri adətən öz böyük qardaşına güzəştə getməli olur;* **2)** təhvil vermək, vermək; *Please give in your examination papers now Lütfən indi imtahan yazı işlərini təhvil ver/verin;* **to ~ off** buraxmaq, vermək; **to ~ smoke off** tüstü vermək/buraxmaq; **to ~ smell off** iy buraxmaq / vermək; **to ~ on to** baxmaq, açılmaq; *The bedroom windows give on to a courtyard Yataq otağının pəncərələri həyətə baxır / açılır;* **to ~ out 1)** tükənmək, qurtarmaq; *Our food supplies began to give out Bizim ərzaq ehtiyatımız tükənməyə başladı; Her patience gave out Onun səbri tükəndi;* **2)** paylamaq, göndərmək; **to ~ out books** kitabları paylamaq; **3)** xarab olmaq; *The car gave out Maşın xarab oldu;* **to ~ up 1)** tərk etmək, qoyub getmək; *He was forced to give up his native country Onu vətəni tərk etməyə məcbur etdilər;* **2)** imtina etmək *(işdən, təklifdən, yarışda iştirakdan və s.)*, tərgitmək; **3)** əl çəkmək, atmaq *(vərdişi, papiros çəkməyi və s.)*; **to ~ up the thought** fikrindən əl çəkmək; *You should give up smoking Sən/ Siz papiros çəkməyi atmalısan/atmalısınız; I wish I could give up smoking Kaş papiros çəkməyi ata biləydim;* **to ~ *smb.* up 1)** bir kəsdən əlini üzmək; *Even his teachers have given him up Hətta müəllimləri ondan əllərini üzmüşdülər; The doctors have given him up Həkimlər ondan əllərini üzüblər;* **2)** təslim etmək, təhvil vermək; *Shall we let the thief go or give him up to the police? Oğrunu buraxaq getsin ya onu polisə təhvil verək?; The escaped prisoner gave himself up Həbsxanadan qaçmış məhbus özünü təslim etdi; The fort was given up to the enemy İstehkam düşmənə təslim edildi;*
◊ **to ~ a hand** əl vermək; kömək əlini uzatmaq, kömək etmək; **to ~ *one's* hand** ərə getmək; **to ~ a leg/a shoulder** dırmaşmağa /minməyə kömək etmək; **to ~ thanks** təşəkkür etmək; **to ~ good words** xoş sözlərlə xeyir-dua vermək; **to ~ fits** söymək, başağrısı vermək; **to ~ a lesson/ a lecture to *smb.*** bir kəsə dərs vermək, bir kəsi məzəmmətləmək; **to ~ it *smb.* hot/strong** bir kəsin abrını vermək/ətəyinə bükmək, bir kəsə toy tutmaq; **to ~ *smb.* hell 1)** bir kəsə od qoymaq/toy tutmaq; **2)** hücum etmək; **to ~ *smb.* what for** bir kəsə ağzından gələni demək; **to ~ the lie to** yalanın üstünü açmaq; **to ~ ground 1)** geri çəkilmək; **2)** güzəşt etmək; **3)** əsaslandırmaq; **to ~ a handle** əlinə bəhanə/fürsət vermək; **to ~ ear to** qulaq vermək/asmaq; **to ~ oneself airs** özünü dartmaq /çəkmək, lovğalanmaq; **to ~ a horse his head** atın cilovunu/başını buraxmaq; **to ~ a man his head** bir kəsin işinə qarışmamaq, bir kəsə sərbəstlik vermək; **to ~ line/head/ rein** sərbəst fəaliyyət imkanı vermək, başına buraxmaq; **to ~ the bird 1)** işdən çıxarmaq; **2)** xoruzunu qoltuğuna vermək; *Give him an inch and he will take an ell ≅ Üz versən, astar da istəyər*



**give-away¹** ['gɪvə,weɪ] *n d.d.* **1.** sirri açma *(bilmədən)*; qəsdən edilməyən satqınlıq; **2.** ucuz /su qiymətinə verilən mal/əmtəə *(müştəriləri cəlb etmək üçün)*

**give-away²** ['gɪvə,weɪ] *adj* ucuz *(qiymət haq.)*; **at a ~ price** su qiymətinə, çox ucuz qiymətə

**given** ['gɪvn] *adj* **1.** verilmiş, bağışlanmış, hədiyyə edilmiş; **~ name** ayama, ad *(soy adından fərqli olaraq verilən ad)*; **2.** həvəsli, meylli, bir şeylə həddindən artıq maraqlanan, aludə; **~ to drink** içkiyə aludə/meylli; *I am not given that way myself Mən özüm o qədər də aludə deyiləm;* **3.** müəyyən olunmuş, şərtləşdirilmiş; **at a ~ time** müəyyən olunmuş/şərtləşdirilmiş vaxtda; **within a ~ period** müəyyən olunmuş dövr / vaxt ərzində

**given** ['gɪvn] **give** *felinin pt və pp formaları*

**giver** ['gɪvəʳ] *n* verən / bəxş edən şəxs

**gizzard** ['gɪzəd] *n* **1.** pətənək *(quşların çinədanının yemini həzm edən/üyüdən hissəsi)*; **2.** *d.d.* boğaz, hülqum;
◊ **to stick in *one's* ~** ≅ kal armud olub boğazda qalmaq, təngə gətirmək, zəhləsini tökmək

**glabrous** ['gleɪbrəs] *adj* hamar, çılpaqlaşdırılmış, lüt, tüksüz

**glace** ['glæseɪ] *adj* **1.** *fr.* hamar, parıldayan, parlaq, pardaqlanmış; **~ silk** parlaq/parıldayan ipək; **2.** şəkərlənmiş, şəkərli *(meyvə haq.)*; **~ cherries** şəkərlənmiş / şəkərli albalı; **3.** dondurulmuş *(meyvə haq.)*

**glacial** ['gleɪsɪəl, 'gleɪʃl] *adj* **1.** buzlaq; **~ epoch/era/period** buzlaq dövrü /erası/zamanı; **a ~ man** buzlaq dövrünün adamı; **2.** buz, buz üstündə/arasında olan; **enormous ~ masses** nəhəng buz kütlələri; **3.** dondurucu, buzlandırıcı; soyuq, buz kimi; **~ weather** buz kimi hava; **4.** *məc.* soyuq, buz kimi soyuq; **~ smile** soyuq təbəssüm; **~ manner** soyuq davranış; *The girl didn't like his glacial manner of speaking Onun soyuq danışıq tərzini qız xoşlamadı*

**glaciate** ['gleɪsɪeɪt] *v* **1.** dondurmaq, buza döndərmək, buz halına gətirmək/salmaq; **2.** *tex.* üzünü / səthini donuqlandırmaq / tutqunlaşdırmaq

**glacier** ['glæsɪəʳ, 'gleɪʃəʳ] *n* buz kütləsi; buzlaq buzu

**glacis** ['glæsɪs] *n* **1.** *geol.* torpaq yığını; **2.** *hərb.* torpaq yığını, sipərin döşü *(əsgərləri və topları düşmən atəşindən gizlətmək üçün səngərin önündə yığılmış torpaq)*

**glad** [glæd] *adj* **1.** şad, məmnun; *I am glad to see you Səni/Sizi görməyimə şadam; I am glad of his success Onun uğuru məni çox sevindirir; The girl was very glad of his resolution Qız onun cəsarətinə ürəkdən şad oldu/sevindi;* **2.** sevincli, fərəhli, ürəkaçan; sevindirici, fərəhləndirici; *Have you heard the glad news? Sən/siz bu ürəkaçan xəbəri eşitmisənmi? /eşitmisinizmi?; All nature seemed glad Bütün tə-*

*biət sanki sevinc içində idi;* ~ **cry** sevinc harayı; ~ **countenance** sevinclə/fərəhlə dolu çöhrə; *A glad New Year! Yeni iliniz uğurlu olsun! Yeni iliniz mübarək!;*

◊ ~ **rags** toy paltarı, bayram libası; **to give** ***smb.*** **the** ~ **eyes** bir kəsə qaş-göz etmək; **to give** ***smb.*** **the** ~ **hand** bir kəsə əl verib xoşgəldin etmək; ~ **hand** səmimi qəbul

**gladden** [´glædn] *v* **1.** sevindirmək, şənləndirmək; *He was gladdened by the sight of home Doğma ocağın görünüşü onu sevindirdi;* **2.***arx.* sevinmək

**glade** [gleɪd] *n* **1.** tala, açıqlıq, çəmən *(meşədə);* **bright/lovely/sunny** ~ işıqlı /gözəl / günəşli tala; **2.** *amer.* hündür ot basmış bataqlıq sahə; **3.** *arx.* suyun üzərində işıq zolağı *(ay işığının)*

**gladful** [´glædfl] *adj arx.* şən, fərəhli, razı, məmnun

**gladiator** [´glædɪeɪtə$^{r}$] *n* **1.** qladiator; **2.** *məc.* inadcıl pəhləvan; inadcıl mübahisəçi

**gladiatorial** [.glædɪə´tɔ:rɪəl] *adj* qladiator, qladiatora aid olan; ~ **combats** qladiator döyüşləri

**gladiolus** [.glædɪ´ouləs] *n (pl* **-li** [-laɪ], **-es** [-ɪz]) *bot.* **1.** qladiolùs, qarğasoğanı; **2.** *anat.* döş sümüyünün cismi; **3.** tünd qırmızı rəng

**gladly** [´glædlɪ] *adj* məmnuniyyətlə, həvəslə, fərəhlə; *He did that gladly and willingly O bunu həvəslə və məmnuniyyətlə etdi*

**gladness** [´glædnɪs] *n* sevinc, fərəh, şadlıq, nəşə

**gladsome** [´glædsəm] *adj* şən, şad, xürrəm, ürəkaçan; ~ **morning** ürəkaçan səhər; ~ **birds** şən quşlar; **with** ~ **looks** mehriban baxışlarla, gülər / xoş üzlə

**Gladstone** [´glædstən] *n* **1.** dəri yol çantası, dəri sakvoyaj; **a** ~ **bag** dəri yol çantası; **2.** iki yerli minik; **3.** *istehz.* yüngül fransız şərabı

**glair[1]** [gleə$^{r}$] *n* **1.** yumurta ağı; **2.** özlü/selikli maddə

**glair[2]** [gleə$^{r}$] *v* yumurta ağı sürtmək

**glairy** [´gleərɪ] *adj* **1.** zülallı; **2.** yumurta ağı çəkilmiş

**glamor** [´glæmə$^{r}$] *n* = **glamour**

**glamour[1]** [´glæmə$^{r}$] *n* cazibə, lətafət, gözəllik, füsunkarlıq; romantik halə / şəfəq; **the** ~ **of moonlight on the sea** dənizdə bərq vuran ay işığının cazibəsi; **to cast a** ~ **over** məftun/heyran etmək

**glamour[2]** [´glæmə$^{r}$] *v* məftun etmək, ovsunlamaq, heyran etmək

**glamourous** [´glæmərəs] *adj* **1.** qəşəng, cazibəli, cazibədar, məftunedici, sevimli; **a** ~ **girl** qəşəng qız; **a** ~ **boy** qəşəng oğlan; **2.** təsirli, effektli

**glamoury** [´glæmərɪ] *adj* = **glamourous**

**glance[1]** [gla:ns, glæns] *n* **1.** nəzər, baxış; **impatient /cool /hard /furious** ~ narahat / soyuq / sərt / qəzəbli baxış; **stealthy** ~ oğrun baxış; **at the first** ~ ilk baxışda; **at a** ~ ilk baxışdan; **to give / to take a** ~ **at** baxmaq, nəzər salmaq; **to cast/to fling/to throw/to toss a** ~ **at/upon** nəzər salmaq/ yetirmək, ötəri baxmaq, ani nəzər salmaq / yetirmək; **to dart / to flash a** ~ **at** cəld nəzər salmaq, baxmaq; **to steal a** ~ **at** oğrun-oğrun baxmaq; **to interchange ~s** baxışmaq, bir-birinə baxmaq/ nəzər salmaq; **2.** şölə, şəfəq, nur, parıltı, bərq

**glance[2]** [gla:ns] *v* I **1. (at, over, through, round, down)** ötəri nəzər salmaq, gözucu baxmaq; *The girl glanced shyly at him from behind her fan Qız yelpiyinin arxasından utana-utana gözucu ona baxdı;* **to** ~ ***one's*** **eye/look at/ down/ upon** iti/ cəld nəzər salmaq, gözucu baxmaq; *He glanced his eye down the classified advertisements O cəld sərlövhələrlə verilmiş elanlara nəzər saldı;* **2.** parıldamaq, işıldamaq, şəfəq vermək, bərq vurmaq; *Their helmets glanced in the sunlight Onların dəbilqələri günəş işığında parladı; The ice was glancing in the sun Buz günəş altında bərq vururdu/parıldayırdı;* **3.** əks etmək, əksi düşmək; *The earthenware glanced back the flame of the lamp Saxsı qablar lampanın işığını əks etdirdi;* **4.** əks etdirmək; əks olunmaq; *The rays of the rising sun glanced in the windows of the house Qalxan günəşin şüaları evin pəncərələrində əks olundu;* **5.** üzdən keçmək, siyirib keçmək *(soyuq silah haq.),* (*həm də* **to** ~ **aside/from/off)** *The arrow glanced off his armour Ox onun dəmir geyimini siyirib keçdi; The blow only glanced off the bone Zərbə sümüyə yüngülcə toxunub keçdi*

**glance** [gla:ns] *v* II cilalamaq, pardaqlamaq, parıldatmaq

**gland** [glænd] *n* I **1.** *anat.* vəz, limfa vəzi; **lachrymal** ~ gözyaşı vəzi; **sweat** ~ tər vəzi; **2.** *pl* boyun vəziləri; **3.** *pl* badamcıq vəziləri; **4.** *bot.* vəzicik; ~ **cell** *bot. bitkilərdə efir yağı, qətran və ya yağlı maddələr hasil edən hüceyrə;* **5.** *biol.* vəzi hüceyrəsi

**gland** [glænd] *n* II **1.** *tex.* kipkəc; ~ **packing** kipkəc doldurması, kipkəc döşəkcəsi; **2.** kauçuk və ya metal halqa

**glanderous** [´glændərəs] *adj bayt.* saqqolu, manqo xəstəliyinə tutulmuş

**glanders** [´glændəz] *n bayt.* manqo, saqqo *(təkdırnaqlı heyvanlarda yoluxucu xəstəlik)*

**glandiform** [´glændɪfɔ:m] *adj* **1.** qoza formasında; **2.** *fiziol.* adenoid, udlaq badamcığına aid; vəziyəbənzər, vəzili

**glandular** [´glændjulə$^{r}$] *adj anat.* vəzili; ~ **stomach** çinədan

**glandule** [´glændju:l] *n* **1.** vəzi; **2.** balaca şiş; şişmə

**glare[1]** [gleə$^{r}$] *n* **1.** gözqamaşdırıcı / parlaq işıq/parıltı; **the** ~ **of the sun on the water** suyun üzərində günəşin gözqamaşdırıcı parıltısı; **2.**



parıltılı bərbəzək; **3.** əzəmət, parıltı; **the** ~ **of the footlights** rampaların parıltısı/gur işığı; **4.** sərt/mərhəmətsiz/ şiddətli/iti nəzər; *He looked at me with an angry glare O, sərt nəzərlə mənə baxdı*

**glare[2]** [gleə$^{r}$] *v* **1.** işığa qərq olmaq, nur saçmaq, parlamaq; *The tropical sun glared down on us all the day Tropik günəş bütün günü bizi yandırıb qarsaladı; The palace glared with dazzling lights Saray gözqamaşdırıcı işıqlara qərq olmuşdu;* **2. (at/on/upon)** gözünü zilləyib hirslə baxmaq, qəzəblə baxmaq; *They stood glaring at each other Onlar qəzəblə bir-birinə baxaraq dayandılar*

**glaring** [´gleərɪŋ] *adj* **1.** gözqamaşdırıcı, parlaq; ~ **light** gözqamaşdırıcı/parlaq işıq; **a car with** ~ **headlights** gözqamaşdırıcı faralı / fənərli avtomobil; ~ **neon signs** gözqamaşdırıcı neon reklamları; **2.** çox parlaq, diqqəti cəlb edən, qeyri-adi; ~ **colours** çox parlaq rənglər; **3.** hirsli, qəzəbli; ~ **eyes** qəzəbli gözlər; **4.** kobud, yolverilməz, eşidilməmiş, biabırçı; ~ **mistake /error** kobud səhv; ~ **injustice** yolverilməz ədalətsizlik; ~ **falsehood** məlum / açıq-aşkar yalan

**glaringly** [´gleərɪŋlɪ] *adv* **1.** parlaq surətdə, aydın, aydınca; *The mistakes were glaringly obvious Səhvlər aydınca gözə çarpırdı;* **2.** meydan oxuyurcasına, həyasızcasına; **3.** kobud surətdə, kobudcasına

**glass[1]** [gla:s, glæs] *n* **1.** şüşə; **armoured / stained** ~ armatur daxil etməklə möhkəmləşdirilmiş rəngli şüşə; **frosted** ~ donuq şüşə; **a pane of** ~ pəncərə şüşəsi; **a piece of broken** ~ şüşə qəlpəsi; **a shiver/ a splinter of** ~ şüşə qırıntısı; **bottles made of** ~ şüşədən düzəldilmiş butulkalar; **to case in** ~ şüşənin altına yerləşdirmək/salmaq; **2.** şüşə qab; ~ **and china** şüşə və çini qab; **medicine** ~ menzurka; **3.** stəkan; **to drink a** ~ **of milk** bir stəkan süd içmək; **cracked** ~ çat stəkan; **4.** qədəh, piyalə, badə *(həm də* **wine** ~); **to clink ~es** qədəhləri toqquşdurmaq/bir-birinə vurmaq; **to empty a** ~ qədəhi içib boşaltmaq; **to raise** ***one's*** ~ **to** ***smb.*** bir kəsin sağlığına badə qaldırmaq; **5.** parnik, istixana; parnik/istixana çərçivəsi; *There are many acres of glass in Absheron Abşeronda çoxlu akrlarla istixanalar var;* **6.** güzgü, ayna *(həm də* **looking** ~); **to look in the** ~ güzgüdə özünə baxmaq; **7.** *pl* eynək, gözlük; *She can't read without glasses O, gözlüksüz oxuya bilmir;* **rimless ~es** sağanaqsız gözlük, pensne; **to wear** ~ gözlük taxmaq; **8.** müşahidə borusu; *The sailor looked through his glasses Dənizçi müşahidə borusundan baxdı;* **9.** teleskop; **10.** mikroskop; **11.** zərrəbin; **magnifying** ~ böyüdücü zərrəbin/lupa; **12.** barometr; *The glass is falling Barometr aşağı düşür;* **13.** qum saatı; **14.** *geol.* vulkanik şüşə;

◊ **to have/to take a** ~ **too much** həddindən artıq içmək; **to be fond of/to enjoy** ***one's*** ~ içkiyə qurşanmaq/qızışmaq /aludə olmaq; **to look through green ~es** həsəd aparmaq; qısqanmaq; **to see through blue ~es** hər şeyə bədbinliklə baxmaq; **to see through rose-coloured ~es** ideallaşdırmaq, nöqsanları görməmək; *Those who live in glass houses / in houses of glass should not throw stones at. söz. ≅ Döymə taxta qapımı, döyməyim dəmir qapını*

**glass[2]** [gla:s] *adj* şüşə; **a** ~ **roof** şüşə dam; **a** ~ **door** şüşə qapı; ~ **fibre** şüşə lif; ~ **structure** *geol.* şüşəyəoxşar struktur

**glass[3]** [gla:s] *v* **1.** parnikdə / oranjereyada əkmək /yetişdirmək; **to** ~ **peaches** oranjereyada /istixanada şaftalı yetişdirmək; **2.** şüşə salmaq; şüşə ilə örtmək; **3.** hamarlamaq, cilalamaq; **4.** güzgüyə baxmaq *(özünə)*; **5.** əks olunmaq; **to** ~ **oneself** əks olunmaq *(güzgüdə olduğu kimi); The mountains glass themselves in the lake Dağlar göldə əks olunurlar*

**glass-artist** [´gla:s.a:tɪst] *n* vitrajist, şüşə nəqqaşı

**glass-blower** [´gla:s.blouə$^{r}$] *n* şüşəçi, üfürməklə şüşə məmulatları hazırlayan usta

**glass-blowing** [´gla:s.blouɪŋ] *n* şüşə üfürmə

**glass-case** [´gla:skeɪs] *n* vitrin *(mağaza sərgisi)*

**glass-culture** [´gla:s.kʌltʃə$^{r}$] *n* parnikdə/istixanada becərmə/yetişdirmə

**glass-cutter** [´gla:s.kʌtə$^{r}$] *n* **1.** şüşə salan/ kəsən fəhlə; **2.** şüşə yonan/tərəş edən usta; **3.** almaz *(şüşə kəsmək üçün)*

**glass-dust** [´gla:sdʌst] *n* sumbata, najdak

**glassed-in** [´gla:st´ɪn] *adj* şüşələnmiş, şüşəli; ~ **bookcase** şüşəli kitab rəfi

**glass-eye** [´gla:s´aɪ] *n* süni göz, göz protezi

**glassful** [´gla:sful] *n* stəkan *(ölçü qabı);* **a** ~ **of milk** bir stəkan süd

**glass-furnace** [´gla:s.fə:nɪs] *n* şüşəəritmə sobası

**glass-house** [´gla:shaus] *n* **1.** şüşə zavodu; **2.** istixana, oranjereya; **3.** fotoatelye *(şüşədamlı)*

**glassine** [gla:´si:n] *n* perqament *(kağız növü)*

**glass-paper** [´gla:s.peɪpə$^{r}$] *n* sumbata *(kağızı)*

**glass-ware** [´gla:sweə$^{r}$] *n* şüşə qab-qacaq; *There's plenty of glass-ware in the house Ev şüşə qab-qacaqla doludur*

**glass-wool** [´gla:s´wul] *n tex.* steklovata, süni şüşə lif

**glass-work** [´gla:swə:k] *n* **1.** şüşə istehsalı; **2.** şüşə məmulatı

**glassy** [´gla:sɪ] *adj* **1.** güzgü kimi, hamar, şəffaf; **2.** ölgün, cansız, işıqsız, ifadəsiz; ~ **stare** cansız / ölgün baxış

**Glaswegian[1]** [glæs´wi:dʒjən] *n* Qlazqo sakini, Qlazqolu

**Glaswegian[2]** [glæs´wi:dʒjən] *adj* Qlazqo şəhərinə aid

**glaucoma** [glɔ:ˈkoumə] *n tib.* qlaukoma *(göz xəstəliyi)*
**glaucous** [ˈglɔ:kəs] *adj* **1.** bozumtul yaşıl, bozumtul göy; **2.** donuq, tutqun, qeyri-şəffaf; **3.** *bot.* kif basmış, kiflənmiş, bozarmış
**glaze**[1] [gleɪz] *n* **1.** şir, mina, cila; **2.** *məc.* pərdə; **the ~ of death over his eyes** onun gözlərində ölüm pərdəsi; **3.** minalı qab; **4.** *amer.* buz qatı, buz örtüyü
**glaze**[2] [gleɪz] *v* **1.** şüşə salmaq, şüşələmək, aynalamaq; **to ~ a window** pəncərəyə şüşə salmaq; **to frame and ~ a picture** şəkli şüşəli çərçivəyə salmaq; **2.** şirələmək, mina çəkmək; **to ~ earthenware / porcelain** saxsı/çini qablara mina çəkmək; **3.** *məc.* gizlətmək, ört-basdır etmək, malalamaq; *His friends tried to glaze his foibles Dostları onun nöqsanlarını ört-basdır etməyə çalışırdılar;* **4.** ölgünləşmək, şüşəyə dönmək *(göz haq.); His eyes glazed over Onun gözləri sanki şüşəyə dönmüşdü;* **5.** şirə gəzdirmək *(xörəyə);* **6.** cilalamaq, pardaqlamaq
**glazed** [gleɪzd] *adj* **1.** şüşələnmiş; **2.** şirələnmiş, mina çəkilmiş
**glazier** [gleɪzjəʳ] *n* **1.** şüşəsalan; **2.** şüşə mütəxəssisi; **3.** dulusçu;
◊ *Is your father a glazier? Divar kimi nə kəsmisən qabağımı,! (tamaşaçıya mane olan şəxsə kinayə ilə müraciət)*
**glazing-wheel** [ˈgleɪzɪŋwi:l] *n* sumbata/najdak çarxı
**glazy** [ˈgleɪzɪ] *adj* **1.** minalı, parlaq; **2.** donuq, süst *(baxış)*
**gleam**[1] [gli:m] *n* **1.** zəif/solğun işıq; işıltı, işarantı, işartı; **the ~ of a distant light-house** uzaqdan gələn mayakın işartısı; **the first ~s of the morning sun** sübh günəşinin ilk işartıları; **2.** parıltı, şəfəq *(qürub edən/batan günəş haq.);* **3.** ümid qığılcımı, işıq yeri; **not a ~ of hope** zərrə qədər işıqucunun/ümid yerinin olmaması; **a ~ of intelligence** ağıl əlaməti, idrak işarıntısı
**gleam**[2] [gli:m] *v* **1.** işıqlanmaq; işığı gəlmək, nur saçmaq, parıldamaq; *A light gleamed in the distance Uzaqda işıq parladı; A cat's eyes gleam in the darkness Pişiyin gözləri qaranlıqda parıldayır;* **2.** əks olunmaq; *The distant stars gleamed on the lake Uzaq ulduzlar gölün səthində əks olunurdu*
**glean** [gli:n] *v* **1.** başaq etmək *(biçindən sonra yerə tökülən sünbülləri yığmaq);* **to ~ a field** məhsul yığımından sonra tökülmüş sünbülləri yığmaq; **2.** peşarı etmək *(üzüm, meyvə və s. yığımından sonra qalanlarını yığmaq);* **3.** *məc.* zərrə-zərrə toplamaq *(faktları, məlumatları);* **to ~ facts from books** kitablardan faktları zərrə-zərrə toplamaq
**gleaner** [ˈgli:nəʳ] *n* **1.** başaq / peşarı edən fəhlə; **2.** *k.t.* stripper *(sünbülü haşəmdən ayıran, taxılı döyən və təmizləyən mürəkkəb maşın)*

**gleanings** [ˈgli:nɪŋz] *n* **1.** başaq/peşarı etmə; **2.** zərrə-zərrə fakt/məlumat toplama; **3.** cüzi bilik
**glebe** [gli:b] *n* **1.** *şair.* torpaq, tarla; **2.** kilsə torpaqları; **3.** filiz yatağı olan saho
**glebe-house** [ˈglɪ:bhaus] *n* kənd pastorunun *(protestant keşişinin)* evi
**glee** [gli:] *n* **1.** şadlıq, şənlik, şadyanalıq, sevinc; **full of ~** sevinclə dolu, şadlıq içində; *She was in high glee when she learnt the news Bu şad xəbər ona çatanda o, böyük sevinc hissi keçirdi;* **2.** bir neçə səslə müşayiətsiz ifa olunan mahnı
**gleeful** [ˈgli:ful] *adj* şən, şad, sevindirici; **~ news** şad xəbər; **in ~ mood** şən əhval-ruhiyyədə
**gleesome** [gli:səm] *adj* = **gleeful**
**gleet**[1] [gli:t] *n tib.* **1.** xroniki uretrit; **2.** *arx.* lehmə, lil, palçıq
**gleet**[2] [gli:t] *v* selik / irin ifraz etmək
**glen** [glen] *n* dərə, dar vadi
**glengarry** [ˌglenˈgærɪ] *n arxasında lenti olan şotland papağı (həm də* **~ bonnet/ cap)**
**gletscher** [ˈgletʃəʳ] *n* buzxana, qletçer
**glib**[1] [glɪb] *adj* **1.** zirək, dilli-dilavər; **to have a ~ tongue** dildən zirək/pərgar olmaq; **2.** danışqan, naqqal, çərənçi, gəvəzə; **a ~ talker** naqqal/çərənçi/gəvəzə adam; **3.** zahirən münasib / ləyaqətli; **~ excuse** üzürlü bəhanə; **4.** hamar *(səth haq.)*
**glib**[2] [glɪb] *v* **1.** *arx.* sərbəst hərəkət etmək; **2.** çərənləmək, gəvəzəlik/naqqallıq etmək; **3.** *arx.* hamarlamaq
**glide**[1] [glaɪd] *n* **1.** süzmə, süzüb getmə, sürüşmə; *The skaters moved with a glide on the ice Konki sürənlər buzun üzərində süzürdülər;* **2.** zamanın axarı; **3.** *av.* yavaş-yavaş/tədricən enmə; **~ landing** yavaş-yavaş enmə *(təyyarə haq.)*
**glide**[2] [glaɪd] *v* **1.** sürüşmək, süzmək, rəvan hərəkət etmək; *The skaters glided swiftly over the ice Konki sürənlər sürətlə buzun üzərində sürüşürdülər; A boat glided past Qayıq sürətlə üzüb yanımızdan keçdi;* **2.** sakit-sakit axmaq; *A brook glided through the valley Vadi boyunca kiçik bir çay sakit-sakit axırdı;* **3.** hiss etmədən ötüb keçmək *(vaxt haq.);* **4.** yavaş-yavaş/ gizlicə/səssiz-səmirsiz hərəkət etmək; *She glided quietly out of the room O sakitcə sürüşüb otaqdan çıxdı;* **5.** tərpətmək, hərəkətə gətirmək; *The wind glided the boat over the water Külək suyun üzərində qayığı hərəkətə gətirdi;* **6.** hiss etmədən müəyyən bir vəziyyətə düşmək; **to ~ hopelessly into debt** hiss etmədən borca düşmək
**glide-bomb** [ˈglaɪdbɔm] *n hərb.* uçan bomba, bomba-təyyarə
**glider** [ˈglaɪdəʳ] *n* **1.** planer *(motorsuz uçaq);* **2.** *amer.* yelləncək-divan
**glider-bomb** [ˈglaɪdəbɔm] *n* = **glide-bomb**
**glider-pilot** [ˈglaɪdəˌpaɪlət] *n* planerist, planer pilotu
**gliding** [ˈglaɪdɪŋ] *n* **1.** sürüşmə; **2.** *av.* tədricən yerə enmə; **3.** planer idmanı, planer sürməklə məşğul olma



**glim** [glɪm] *n sl* **1.** işıq, lampa, şam; **to douse the ~** işığı söndürmək; **2.** göz; **3.** *pl arx.* gözlük, eynək
**glimmer**[1] [ˈglɪməʳ] *n* **1.** parıldama, titrək işıq vermə, sayrışma; işarantı, zəif işıq; **a ~ of dawn** sübhün gözü, şəfəqin sökülən çağı; **a ~ of pearls** sədəf çalarlı mərcan; **a ~ of light through the curtains** pərdələrin arasından süzülən zəif işıq; **2.** *məc.* işıq, qığılcım; **a ~ of hope** ümid qığılcımı, ümid işığı; **3.** *d.d.* od
**glimmer**[2] [ˈglɪməʳ] *v* titrək işıq vermək, sayrışmaq; *A distant taper glimmers through the mist Dumandan süzülən uzaq məsafədəki şamın işartısı güclə görünür*
**glimmering** [ˈglɪmərɪŋ] *n* **1.** titrək işıq vermə; çox zəif işıq, işartı; **2.** tutqun/dumanlı təsəvvür; anlaşılmaz eyham; **to obtain a ~ of** ***smth.*** bir şey haqqında bir qədər təsəvvür əldə etmək
**glimpse**[1] [glɪmps] *n* **1.** yanıb sönmə, görünüb yox olma, parlayıb sönmə; **to see by ~s** ötəri görmək; **2.** bir anlığa gözün qabağına gələn mənzərə; **to have /to get / to catch/to obtain a ~ of** ***smb. /smth.*** bir kəsi/şeyi ötəri görmək; *From this point you will get the last glimpse of the sea Bu yerdən sən/siz dənizi son dəfə görəcəksən / görəcəksiniz;* **3.** cəld baxış; **at a ~** ilk baxışdan; **4.** bir az təsəvvür; **a ~ of Byron** Bayron haqqında bir az təsəvvür
**glimpse**[2] [glɪmps] *v* ötəri nəzər salmaq; *He just glimpsed at the newcomer O təzə gələn adama yalnız ötəri bir nəzər saldı*
**glint**[1] [glɪnt] *n* **1.** parıldama, şəfəq saçma, bərq, parlaq işıq; **2.** sayrışan işıq; **the earliest ~s of the morning** sübhün ilk şəfəqləri
**glint**[2] [glɪnt] *v* **1.** parıldamaq, şəfəq saçmaq, bərq vurmaq; *The sun glinted through the branches Günəşin parlaq şüaları budaqların arasından süzülürdü;* **to ~ in the sun** günəşin altında parıldamaq; **2.** işığı əks etdirmək
**glissade** [glɪˈsa:d] *n* **1.** sürüşmə; **2.** qlissye *(rəqsdə süzə-süzə oynama)*
**glissando** [glɪˈsændou] *adv mus.* qlissando *(musiqi alətinin dilləri və ya simləri üzərində barmaqları iti və yüngül surətdə sürüşdürməkdən ibarət çalma üsulu)*
**glisten**[1] [ˈglɪsn] *n* parıldama, parıltı; **~ of dew-drops** jalələrin parıltısı
**glisten**[2] [ˈglɪsn] *v* parıldamaq, şəfəq saçmaq, bərq vurmaq; *Her eyes glistened with pleasure Onun gözləri məmnunluqla gülürdü / parıldayırdı*
**glister** [ˈglɪstəʳ] *n, v* = **glisten**[1,2]
**glitter**[1] [ˈglɪtəʳ] *n* **1.** parıldama, parıltı, şəfəq saçma; **the ~ of gold** qızılın parıltısı; **2.** dəbdəbə, büsat, əhtişam, calal, cah-calal; **the ~ of the dresses** geyimlərin/paltarların büsatı; **3.** parıltılı bərbəzək/oyuncaq; **the ~s of the Christmas tree decorations** mövlud yolkasının bərbəzəyi / oyuncaqları

**glitter**[2] [ˈglɪtəʳ] *v* **1.** parıldamaq, şəfəq saçmaq; *The snow glittered like diamonds in the sun Qar günəşin altında almaz kimi bərq vururdu/şəfəq saçırdı;* **2.** *məc.* heyran etmək, təsir bağışlamaq; seçilmək; **to ~ with jewels** daş-qaşla heyran etmək, daş-qaşla seçilmək;
◊ *All is not gold that glitters Hər parıldayan qızıl olmaz,* ≅ *Hər oxuyan Molla Pənah Vaqif olmaz*
**gloam** [gloum] *v* qaş qaralmaq, qaranlıq düşmək
**gloaming** [ˈgloumɪŋ] *n* qaş qaralan vaxt; axşam alaqaranlığı
**gloat** [glout] *v* **1.** **(over/upon)** gözlərilə yemək, heyranlıqla baxmaq; həsəd aparmaq; tamahkarlıqla baxmaq; *The miser gloated over his gold Xəsis öz qızıllarına heyranlıqla baxıb sevinirdi;* **2.** sevinmək, həzz almaq *(başqasının bədbəxtliyindən);* **to ~ over another's misfortune** başqasının bədbəxtliyinə sevinmək
**gloating** [ˈgloutɪŋ] *adj* bədxah, paxıl, başqasının fəlakətindən / bədbəxtliyindən kam alan; **~ smile** bədxah təbəssüm
**global** [ˈgloubəl] *adj* **1.** qlobal, dünya, cahanşümul, beynəlxalq; **~ war** dünya müharibəsi; **2.** ümumi, hamılıqla; **~ disarmament** ümumi/hamılıqla tərksilah; **3.** şaraoxşar, şarşəkilli, kürəvi, yumru;
◊ **~ method** sözü tam halda oxuma *(qiraət üsulu)*
**globe**[1] [gloub] *n* **1.** şar; **solid ~** bərk şar; **hollow ~** *(içi)* boş şar; **2.: the ~, this ~** yer kürəsi; **to tread the ~** bu dünyada yaşamaq; **to vanish from the surface of the ~** yer üzündən silinmək / yox olub getmək; *These plants were collected from various parts of the globe Bu bitkilər dünyanın müxtəlif yerlərindən toplanıb;* **3.** fəza cismi; **4.** qlobus *(Yer kürəsinin modeli);* **terrestrial ~** Yer kürəsinin qlobusu; **celestial ~** göyün/göy cisimlərinin qlobusu; **5.** yumru şüşə abajur; **6.** hava nasosunun zəngi; **7.: ~ of the eye** *anat.* göz alması
**globe**[2] [gloub] *v* **1.** kürə şəklinə salmaq; **2.** yumrulanmaq; kürə / şar şəklini almaq
**globed** [gloubd] *adj* şarşəkilli, şaraoxşar
**globe-lightning** [ˈgloubˌlaɪtnɪŋ] *n* şarşəkilli şimşək
**globe-trotter** [ˈgloubˌtrɔtəʳ] *n* aravermədən /durmadan xarici ölkələri gəzən şəxs/ adam
**globose** [ˈgloubous] *adj* şaraoxşar, kürəvi, sferik, yuvarlaq
**globosity** [glouˈbɔsɪtɪ] *n* yumruluq, dəyirmilik, kürəvilik, şaraoxşarlıq
**globular** [ˈglɔbjuləʳ] *adj* şarşəkilli, sferik; **~ projection** *riyaz.* sferik proyeksiya
**globule** [ˈglɔbju:l] *n* **1.** şar, şarşəkilli hissəcik; **2.** damcı; **minute ~s of water** kiçik/ xırda su damcıları; **3.** qırmızı qan kürəciyi
**globulin** [ˈglɔbju:lɪn] *n* qlobulin *(zülali maddə)*

**gloom[1]** [glu:m] *n* **1.** qaranlıq, yarıqaranlıq; **Cimmerian ~** qatı qaranlıq, zülmət; **to cast a ~ on smth.** 1) bir şeyi qaranlığa qərq etmək; 2) kədərləndirmək, qəm-qüssəyə qərq etmək; **2.** qəm, qüssə, qaşqabaq, qəmginlik, kədər; *The news cast a gloom over the village Bu xəbər kəndi qəm-qüssəyə qərq etdi; The future seems to be filled with gloom Gələcək qəm-qüssə ilə dolu görünür; His life seemed filled with gloom Görünür, onun həyatda ağ günü olmayıb*

**gloom[2]** [glu:m] *v* **1.** qaşqabağını tökmək, sımsırığını sallamaq; qaşqabaqlı olmaq, məyus olmaq, kədərli olmaq; **2.** kədərləndirmək, qəmləndirmək, ovqatını təlx etmək; *What sorrows gloomed that day? Hansı qayğılar o günü qara etdi/o günün ləzzətini qaçırtdı?;* **3.** tutulmaq, örtülmək, çulğalanmaq *(göyün üzü haq.);* **4.** qaralmaq *(hava haq.); This weary day began to gloom at last Nəhayət bu cansıxıcı günün sonu yaxınlaşmağa başladı*

**gloomy** ['glu:mı] *adj* **1.** qaranlıq, tutqun; **~ sky** tutqun/qaranlıq səma; **~ house** qaranlıq ev; **~ weather** tutqun/buludlu hava; **2.** qaşqabaqlı, qəmgin, qaraqabaq; **a ~ companion** qaraqabaq yol yoldaşı

**gloria** ['glɔ:rıə] *n* qloriya *(çətir, şəmsiyyə düzəltmək üçün istifadə olunan ipək və ya yundan toxunmuş parça)*

**glorification** [glɔrıfı'keıʃn] *n* **1.** şöhrətləndirmə; şöhrətləndirilmə; **2.** tərifləmə; tərifləmə

**glorify** ['glɔ:rıfaı] *v* **1.** şöhrətləndirmək, şöhrət gətirmək; **the names which ~ this age** əsrimizi şöhrətləndirən adlar; **2.** tərifini göylərə qaldırmaq/çıxartmaq, bərk tərifləmək; **to ~ common life** sadə həyatı tərifləmək

**glorioie** ['glɔ:rıoul] *n* nur, halə, şəfəq, parıltı

**glorious** ['glɔ:rıəs] *adj* **1.** çox gözəl, calallı, parlaq, valehedici, heyranedici, məftunedici; **~ day** çox gözəl gün; **~ view** heyranedici mənzərə; **~ music** əla musiqi; **to have ~ time** çox gözəl vaxt keçirmək; **2.** şanlı, şöhrətli, adlı-sanlı, tanınmış; **a ~ victory** şanlı qələbə; **to be ~ by smth.** bir şeylə tanınmaq, bir şeylə şöhrət/ad qazanmaq; **3.** dəhşətli; **~ mess / muddle** dəhşətli qarmaqarışıqlıq/dolaşıqlıq/ hərc-mərclik

**glory[1]** ['glɔ:rı] *n* **1.** şöhrət; **to cover oneself with ~** özünə ad qazanmaq, özünü şöhrətləndirmək; **to win ~** şöhrətlənmək; **to be in all *one's* ~** şöhrətinin zirvəsində olmaq; **2.** zəfər, təntənə, triumf; **to return with ~** zəfərlə qayıtmaq / dönmək; **3.** gözəllik, əzəmət; **the ~ of the morning** səhərin gözəlliyi; **the ~ of the woods in autumn** payızda meşələrin gözəlliyi/ əzəməti; **the glories of ancient Rome** qədim Romanın əzəməti; **4.** cənnət, xəyali xoşbəxtlik; **5.** nur, halə;
◊ *Glory be! Glory! Lənətə gələsən!, Lənət sənə!;* **Old Glory** ABŞ-ın dövlət bayrağı; **to go to ~** 1) dünyasını dəyişmək; 2) *amer.* müflis olmaq; **to send to ~** öldürmək, o dünyaya göndərmək

**glory[2]** ['glɔ:rı] *v* **1.** **(in)** fəxr etmək; **to ~ in *one's* country's victory** öz ölkəsinin qələbəsilə fəxr etmək; **2.** zövq /həzz almaq, şadlıq etmək; **to ~ in *one's* strength** öz gücündən zövq almaq

**gloss[1]** [glɔs] *n* I **1.** parıltı, işıltı, cila, pardaq; **the ~ of silk and satin** ipəyin və satinin parıltısı; **paper with a good ~** cilalı kağız; **2.** saxta, zahiri görkəm / görünüş; **the ~ of novelty** yeniliyin zahiri cəhəti

**gloss** [glɔs] *n* II **1.** haşiyə, şərh *(əlyazmaların mətnində və ya kənarlarında);* **2.** lüğətdə və ya qlossaridə *(qədim sözlər lüğətində)* verilən izahat; **3.** izah, təsvir, şərh *(adət. bir şey haqqında yanlış təsəvvür);* **malicious ~es of *smb.'s* writings** bir kəsin məqaləsini bilərəkdən təhrif etmə; **4.** qlossari *(qədimi sözlər lüğəti); These obscure words can only be found in glosses Bu anlaşılmaz sözləri yalnız qlossaridə tapmaq olar;* **5.** sətirbəsətir tərcümə

**gloss[2]** [glɔs] *v* I **1.** cilalamaq, parıldatmaq; **to ~ silk** ipəyi parıldatmaq; **2.** parıldamaq, işıldamaq; *This cloth glosses easily Bu parça çox tez işıldamağa başlayır;* **3.** **(over)** ən yaxşı şəkildə göstərmək, ört-basdır etmək, üstünü malalamaq; **to ~ over *smb.'s* faults** bir kəsin nöqsanlarını ört-basdır etmək

**gloss** [glɔs] *v* II **1.** qeyd aparmaq *(kənarda və ya sətirlərin arasında);* **2.** izahat/ kommentari vermək; **3.** qlossari tərtib etmək; **4.** yanlış izah etmək

**glossal** ['glɔsəl] *adj anat.* dilə aid / məxsus

**glossarial** [glɔ'serıəl] *adj* qlossariyə məxsus; **~ index** izahedici göstərici/işarə

**glossary** ['glɔsərı] *n* **1.** qlossari; **2.** lüğət *(kitabın sonunda verilən)*

**glossiness** ['glɔsınıs] *n* parlaqlıq, parıltı

**glossitis** [glɔ'saıtıs] *n tib.* qlossit *(dilin iltihabı)*

**glossotomy**[glɔ'sɔtəmı] *n tib.* dilin və ya onun bir hissəsinin kəsilib çıxarılması

**glossy** ['glɔsı] *adj* **1.** parıltılı, işıldayan, parlaq, cilalanmış, cilalı; **~ hair** parlaq saç; **~ surface** cilalanmış səth; **2.** gizli, üstüörtülü; **~ deceit** üstüörtülü yalan

**glove[1]** [glʌv] *n* **1.** əlcək; **dress ~s** parad əlcəyi; **2.** boks əlcəyi; **a ~ box** əlcək qutusu;
◊ **to be hand in/and ~ with** yaxın dost / ürək dostu olmaq; **to fit like a ~** qutu kimi oturmaq, lap əyninə / boyuna görə olmaq; **to handle / to treat without ~s** çox sərt rəftar etmək; **to take the ~ off** qollarını çırmalamaq, qolunu çirməyib işə girişmək; **to fight with the ~s off** amansız mübarizə aparmaq; **to fight with the ~s on** rəqibə mərhəmət göstərmək *(döyüş zamanı);* **to throw down the ~s** rəqibə meydan oxumaq; **to take up the ~s** vuruşa dəvəti qəbul etmək; **to go for the ~s** ehtirasla oynamaq



**glove[2]** [glʌv] *v* **1.** əlcək geymək; **2.** əlcəklə təmin etmək

**gloved** [glʌvd] *adj* əlcəkli, əlcəkdə

**glover** ['glʌvəʳ] *n* **1.** əlcəkçi, əlcək ustası; **2.** əlcəksatan

**glow[1]** [glou] *n* **1.** çox güclü isti, bərk qızma; **a ~ of heat** dözülməz isti; **summer's scorching ~** yayın qızmar istisi; **2.** işıq, parıltı, qızartı; **the ~ of dying embers** sönməkdə olan kömürün qızartısı; **3.** qırmızılıq, allıq; **cheeks with the ~ of health on them** sağlam al qırmızı yanaqlar; **4.** qızğınlıq, coşğunluq, dəliqanlılıq; **in a ~ of enthusiasm** həvəsin coşğun çağında, şövq ilə

**glow[2]** [glou] *v* **1.** pul kimi qızarmaq, qıpqırmızı qızarmaq; **2.** parıldamaq, işıq saçmaq, şəfəq vermək, bərq vurmaq, sayrışmaq; **stars ~ing in the sky** göydə sayrışan ulduzlar; **3.** od tutub yanmaq, od tökülmək *(göz, üz, yanaq və s. haq.),* şölələnmək; *His eyes glowed with indignation Qəzəbdən onun gözləri od tutub yanırdı; Red tulips glowed in the park Parkdakı qızıl zanbaqlar sanki alov kimi alışıb yanırdı;* **4.** xoş bir istilik gəlmək *(bədənə);*
◊ **to be all of a ~, to be in a ~** hərarəti olmaq, od tutub / od içində yanmaq

**glow-beetle** ['glou,bi:tl] *n* = **glow-worm**

**glower[1]** ['glauəʳ] *n* I *el.* közərmə teli

**glower** ['glauəʳ] *n* II hirsli nəzər / baxış

**glower[2]** ['glauəʳ] *v* hirslə baxmaq / nəzər yetirmək

**glowing** ['glouıŋ] *adj* **1.** qıpqırmızı qızarmış; **~ furnace** qıpqırmızı qızarmış soba; **2.** işıq saçan, şölələnən; **~ eyes** parlayan/ şölə saçan gözlər; **3.** qızğın, coşğun; **~ patriot** qızğın vətənpərvər; **4.** parlaq, açıq *(rəng);* **to paint in ~ colours** *şair.* hər şeyi al-əlvan görmək

**glow-lamp** ['gloulæmp] *n* közərmə lampası

**glow-worm** ['glouwə:m] *n zool.* işıldaquş *(böcək)*

**gloxinia** [glɔk'sınjə] *n bot.* qloksiniya *(zəngəoxşar gülləri olan bəzək bitkisi)*

**gloze[1]** [glouz] *n* **1.** yalan, aldatma, kələk; **2.** aldadıcı xarici görünüş, maska, iç üz, əsl surət; **3.** riyakarlıq, ikiüzlülük, sünilik

**gloze[2]** [glouz] *v arx.* **1.** **(on, upon)** izah etmək, komentari vermək; **2.** **(over)** münasib/ yaxşı şərh etmək, anlatmaq; **3.** üzə gülmək, saxtakarlıq etmək, yaltaqlanmaq

**glucose** ['glu:kous] *n kim.* qlükoza *(üzüm şəkəri)*

**glue[1]** [glu:] *n* yapışqan; **~ colour** yapışqanlı boya; **~ putty** yapışqanlı zamaska; **~ dressing** *tib.* yapışqanlı sarğı;
◊ **to stick like ~ to *smb.*** qır-saqqız olub bir kəsə yapışmaq

**glue[2]** [glu:] *v* **1.** yapışdırmaq *(həm də məc); Her face was glued to the mirror O, güzgüdən ayrıla bilmirdi;* **to be ~d to smth./ smb.** bir şeyə/kəsə yapışıb qalmaq; *Her eyes were glued to the keyhole O, gözlərini qapının açar deşiyindən bir an belə ayırmırdı;* **2.** yapışmaq; **to sit ~d to the TV** yapışıb televizorun qabağında qalmaq; *Wood glues well Ağac yaxşı yapışır;* **3.** birləşdirmək, bir-birinə bağlamaq; *This fact glued the whole group together Bu hadisə bütün qrupu birləşdirdi;* **4.** bir-birindən ayrılmamaq, həmişə bir yerdə olmaq; *She is always glued to her mother O, anasından bir addım belə ayrılmır; Why must you always remain glued to your mother? Sən / Siz nə üçün həmişə anana/ananıza bağlanıb qalmalısan?/ qalmalısınız?;* **to ~ up** bağlamaq *(zərfi),* möhürləmək;
◊ **to have *one's* eyes ~d to** gözünü / nəzərləri-ni çəkməmək / ayırmamaq

**gluey** ['glu:ı] *adj* **1.** yapışqan, yapışqanlı; **2.** suvaşqan, yapışqan kimi

**glum[1]** [glʌm] *adj* **1.** tutqun, qaşqabaqlı, qaraqabaq; **a ~ face** qaşqabaqlı sifət; **2.** qəmgin, kədərli; **a ~ old bridge** köhnə, pis günə düşmüş körpü; **3.** tutqun *(hava)*

**glum[2]** [glʌm] *v* qaşqabaqlı baxmaq; qaşqabağını sallamaq

**glume** [glu:m] *n* qabıq *(buğdanın)*

**glut[1]** [glʌt] *n* çoxluq, bolluq, artıqlıq, artıq; **a ~ of pears in the market** bazarda armud bolluğu; **a ~ of wealth** hesaba gəlməyən / bitməz-tükənməz sərvət

**glut[2]** [glʌt] *v* **1.** doydurmaq, doyuzdurmaq; **to ~ *one's* appetite** doyunca yemək; **2.** doldurmaq, ağzınacan doldurmaq; **to ~ the market** bazarı malla doldurmaq; **3.** həzz almaq, nəşələnmək; **to ~ *one's* revenge** qisasından həzz almaq; **4.** gözlərilə yemək; **5.** acgözlüklə bir şeyə can atmaq

**gluten** ['glu:tən] *n* **1.** qlüten, bitki zülalı; **2.** öz *(taxılın tərkibində olub xəmirə yapışqanlıq xassəsi verən zülali maddə)*

**glutenite** ['glu:tənaıt] *n* konqlomerat *(müxtəlif cinsli parçalardan əmələ gəlmiş süxur)*

**glutinous** ['glu:tınəs] *adj* suvaşqan, yapışqan, suvaşqanlı, yapışqanlı

**glutton** ['glʌtn] *n* **1.** qarınqulu; **2.** tamahkar/ acgöz/dargöz adam; *You've eaten the whole pie, you, glutton! Sən piroqun hamısını yedin ki, ay qarınqulu!;* **3.** həddindən çox yeyən heyvan; **4.** oxumaqdan/işləməkdən doymayan adam; *He is a glutton for work O, çox işsevən/işlək adamdır;* **a ~ of book** kitab oxumaqdan doymayan adam; **5.** *zool.* Sibir porsuğu

**gluttonous** ['glʌtnəs] *adj* acgöz, gözüdoymaz, qarınqulu, çoxyeyən

**gluttony** ['glʌtnı] *n* acgözlük, gözüdoymazlıq, qarınqululuq

**glycerin** ['glısərın] *n* = **glycerine**

**glycerine** [,glısə'rı:n] *n kim.* qliserin

**glyptic** ['glıptık] *adj* qliptikaya aid; oyma naxışlı

**glyptics** ['glıptıks] *n* qliptika *(daş, fil sümüyü və s. üzərində naxış salma sənəti),* həkkaklıq, oymaçılıq

**glyptography** [glıp'tɔgrəfı] *n* **1.** qliptoqrafiya *(qiymətli daş üzərində naxış salma),* oyma *(qiymətli daş üzərində);* **2.** həkkaklıq elmi, oyma naxışların öyrənilməsi və ya təsvir edilməsi

**G-man** ['dʒı:mæn] *n (pl* **-men** [mən]) *n amer. d.d.* FTB-nın *(Federal Təhqiqat Bürosu)* zabiti

**gnar** [na:] *v* mırıldamaq *(it haq.)*

**gnarl**[1] [na:l] *n* düyün, damar, buğum, şiş *(ağacda)*

**gnarl**[2] [na:l] *v* kələ-kötür/firlı/düyünlü/əyri-üyrü hala düşmək *(ağac haq.)*

**gnarled** [na:ld] *adj* **1.** kələ-kötür, şiş; **a ~ old oak** kələ-kötür qoca palıd *(ağacı);* **~ hands** kələ-kötür/kobud əllər; **2.** yöndəmsiz, kobud, qaba *(xarici görünüş haq.);* **3.** tərs, inad

**gnarly** ['na:lı] *adj* = **gnarled**

**gnash**[1] [næʃ] *n* qıcırtı *(diş haq.)*

**gnash**[2] [næʃ] *v* dişlərini qıcırdatmaq

**gnat** [næt] *n* **1.** ağcaqanad, ditdili, hünü; **2.** balaca milçək;

◊ **to strain at a ~** xırdaçı olmaq, milçəkdən fil qayırmaq, bir şeyi çox şişirtmək; **to strain at a ~ and swallow a camel** əsas məsələni bir tərəfə qoyub xırda şeydən yapışmaq; ≅ *Eşşəyə gücü çatmayıb, palanı tapdalamaq/döyəcləmək*

**gnaw** [nɔ:] *v* **1.** gəmirmək, çeynəmək, dişləmək; **to ~ (at) a bone** sümük gəmirmək; *The dog was gnawing (at) a bone It bir sümük gəmirirdi; The rats had gnawed away some of the woodwork Siçovullar taxta əşyaların bəzilərini gəmirmişdi;* **to ~ *one's* lips in rage** qəzəbdən dodaqlarını çeynəmək; *The girl was gnawing her fingernails with impatience Qız səbirsizlikdən dırnaqlarını çeynəyirdi;* **2.** yemək *(pas, turşu haq.); Rust gnaws away steel Pas poladı yeyib dağıdır;* **3.** ruhi əzab vermək, üzmək; *Pain gnawed (at) his heart Ağrı onun ürəyini üzürdü;*

◊ **to ~ the bit** baş aparmaq, dayanmaq bilməmək

**gnawer** ['nɔ:əʳ] *n zool.* gəmirici, kəsəyən

**gnome** [noum] *n* I aforizm, kəlam, hikmətli söz

**gnome** [noum] *n* II cin, cırtdan; **a little ~ of a man** bambalaca/bir qarış boyda adamcığaz

**gnomish** ['noumıʃ] *adj* cırtdanabənzər, cin kimi

**gnostic** [nɔstık] *adj fəls.* qnostik *(qnostisizmə aid),* idrak

**gnosticism** ['nɔstısızm] *n fəls.* qnostisizm *(dini-fəlsəfi cərəyan)*

**gnu** ['nu:] *n zool.* qnu *(antilop cinsindən olan heyvan)*

**go**[1] [gou] *n (pl* **goes** [gouz] **1.** hərəkət, yeriş, gediş; **come and ~** gediş-gəliş, vargəl; **2.** vəziyyət, şərait, qəfildən vəziyyətin dəyişməsi; **a capital ~** çox xoş əhvalat; **a near ~** qorxulu vəziyyət, tükdən asılı vəziyyət; *Here's a pretty go!, What a go! Əcəb işdir!; It's a queer/rum/go Qəribə işdir!;* **3.** cəhd; **to have a ~ at** cəhd/ risk etmək, bəxtini sınamaq; *She was staying for another go O bir də bəxtini sınamaq üçün qalırdı; He had several goes at the high jump before he succeeded in clearing it O, hündürlüyü dəf etməzdən əvvəl bir neçə dəfə cəhd etdi;* **4.** pay *(xörək, içki haq.);* **5.** sövdə, razılaşma, saziş; *It's a go! Oldu! Razılaşdıq!;* **6.** enerji, ruhlandırma, sövq; **full of ~** qeyrətli, ruh yüksəkliyi ilə dolu; *There is plenty of go in this music Bu çox temperamentli musiqidir;* **7.** uğur, müvəffəqiyyət; **to make a ~ of it** uğur qazanmaq; **no ~** xeyirsiz; *This plan is no go Bu plan heç nəyə yaramaz;* **8.** boks üzrə görüş; **main ~** həlledici görüş; **9.** növbə, oyun *(oyunda); It's your go! Oyun / Növbə səninindir! / sizindir!*

◊ **to be on the ~** işlə məşğul olmaq; *I've been on the go all day Bütün günü ayaq üstə olmuşam; He is always on the go O həmişə hərəkətdədir, O heç vaxt işsiz oturmur/durmur;* **to give smb. the ~** bir kəsə işarə / siqnal vermək, bir kəsə hərəkətə keçmək üçün icazə vermək; **to be ~** saz olmaq / işləmək *(cihaz, alət, mexanizm haq.);* **quite / all the ~** son moda / dəb; *Leather pyjamas were all the go last year Dəri pijama keçən il dəbdə idi;* **first ~** əvvəl başdan, birinci növbədə; **at a ~** bir dəfəyə, əlüstü, dərhal; *He blew out all the candles on his birthday cake at one go O, ad günü tortunun üstündəki şamların hamısını bir dəfəyə üfürüb söndürdü;* **the great / little ~** son/ilk imtahan *(Kembric və Oksford Universitetlərində bakalavr dərəcəsi almaq üçün)*

**go**[2] [gou] *v (pt* **went**; *pp* **gone** [gɔn]) **1.** getmək, hərəkət etmək; **to ~ slowly** asta-asta/yavaş-yavaş getmək; **to ~ quickly** tez/tez-tez/yeyin/cəld getmək; **to ~ slow 1)** tələsmədən getmək, ehtiyatlı olmaq; **to ~ along the road** yolla getmək; **to ~ upstairs/downstairs** pilləkənlə qalxmaq/ düşmək; *She went to buy some food O bir az ərzaq almağa getdi; He has gone to see her sister O, bacısını görməyə gedib; He went to visit his father O, atasına baş çəkməyə getdi;* **to ~ at full drive/tilt** tam sürətlə getmək; *Be gone!, Go away! Çıx get!; Who goes there? Gələn kimdir? (hərbdə qarovulçunun sualı);* **to ~ to the country** kəndə getmək; **to ~ abroad** xaricə getmək; *He went to France O, Fransaya getdi;* **to ~ on a journey** səyahətə getmək; *They went for a trip to Windsor Onlar Vindzora ekskursiyaya getdilər; He goes to the South every year O hər il cənuba gedir;* **to ~ for a ride/a drive** miniklə gəzməyə getmək; **to ~ for a walk** gəzməyə /gəzintiyə getmək; *The bus goes to London Avtobus Londona gedir;* **to ~ to a party 1)** qonaq getmək; **2)** şənliyə getmək; **to ~ to a meeting** iclasa getmək; *Let's go for a swim Gəl / Gəlin çimməyə gedək;* **to ~ by land** quru ilə getmək; **to ~ by water** su ilə getmək; **to ~ by air** uçaqla getmək; **to ~ by train/by bus/by tram/ by rail/by steamer** qatarla /avtobusla/ /tramvayla/dəmiryolu ilə/paroxodla getmək;



*Shall we go there by train or by plane? Biz ora qatarla, yoxsa təyyarə ilə gedək?;* **to ~ in a carriage/in a motor-car** faytonda/minik maşınında getmək; **to ~ on foot** piyada/ayaqla getmək; *We came at six and went at nine Saat altıda gəldik, doqquzda getdik; It is time for us to go Artıq biz getməliyik, Getmək vaxtı gəldi; I'll be going now Yaxşı, mən getdim; I must be going now, I must be gone İndi mənə getmək lazımdır; She is gone O gedib; The guests are all gone Bütün qonaqlar gedib; Be gone! Get you gone! Çıx get! Rədd ol!;* **2.** yola düşmək; *The train goes from platform 5 Qatar 5-ci platformadan yola düşür;* **3.** işləmək, hərəkət etmək; *My watch is going too fast / slow Saatım çox qabağa qaçır/dala qalır; The engine went beautifully all day Maşın bütün günü gözəl işlədi; The motor won't go Mühərrik işə düşmür; The engine goes by electricity Mühərrik elektriklə işləyir;* **4.** uzanmaq, uzanıb getmək, keçmək; **mountains that ~ from west to east** qərbdən şərqə qədər uzanan dağlar; *How far does the road go? Bu yol nə qədər uzanıb gedir?; Time goes quickly Vaxt tez keçir; Much time has gone since that day O gündən bəri çox vaxt keçib;* **5.** yox /qeyb olmaq, yoxa çıxmaq, itmək; keçib getmək; *Money goes quickly Pul tez yox olur/qurtarır; The clouds have gone Buludlar keçib getdi / dağıldı; The pain has gone Ağrı keçib getdi/kəsdi; His hat has gone Onun şlyapası yoxa çıxıb/qeyb olub; The key has gone Açar yoxa çıxıb;* **6.** yayılmaq; *A rumour went through the office Şayiə bütün idarəyə yayıldı; The story went all over the town; Əhvalat bütün şəhərə yayıldı;* **7.** öz üzərinə götürmək, bir şeyi etmək qərarına gəlmək; *Do not go to any trouble Özünə/Özünüzə zəhmət vermə/ verməyin;* **to ~ to great expense** böyük xərci öz üzərinə götürmək; **8.** çökmək, dağılmaq; iflasa uğramaq, ləğv olmaq; *The platform went Platforma dağıldı; The fuse went Qoruyucu yandı; The bank may go any day Bank hər an iflasa uğraya bilər; This clause of the bill will have to go Qanunun bu bəndi qəbul edilməlidir;* **9.** yerləşdirilmək, müəyyən bir qaydanı gözləmək; *The names go in alphabetical order Adlar əlifba sırası ilə yerləşdirilir; Where is this carpet to go? Bu xalça hara salınacaq?; The shirts go in the second drawer Köynəklər ikinci siyirmədə olur; This book goes on the top shelf Bu kitab lap yuxarıdakı rəfdə olur;* **10. (into, under)** yerləşmək, sığmaq, girmək, keçmək; *The thread is too thick to go into the needle Sap çox yoğundur, bu iynədən keçməz; The book will not go into my pocket Bu kitab mənim cibimə girməz; The trunk will go under the bed Çamadan çarpayının altına sığar/gedər;* **11.** bərabər/ müsavi olmaq; *Twelve inches go to one foot On iki düyüm bir futa bərabərdir; Six into twelve goes twice On iki rəqəmində iki altı rəqəmi var;* **12.** müraciət etmək; **to ~ to law** məhkəməyə müraciət etmək; *You should go to the president Sən/Siz gərək prezidentə müraciət edəsən /edəsiniz; Go to Aristotle for that Sən/Siz gərək bu məsələ üçün Aristotelə müraciət edəsən / edəsiniz;* **to ~ to facts** faktlara müraciət etmək / əl atmaq; **13.** demək, deyilmək; *The agreement goes as follows Müqavilədə aşağıdakılar deyilir;* **14.** zəng çalmaq; *I hear the bells going Mən zənglərin çalınmasını eşidirəm; The bell has gone Zəng artıq vurulub / olub;* **15.** vurmaq *(saat); It has just gone six İndicə saat altını vurdu;* **16.** zəifləmək, itirmək, tükənmək; *My sight is going Gözlərim zəifləyir; His strength is going Onun gücü tükənir;* **17.** ölmək, məhv olmaq *(adət. məc. növdə); She is gone O həlak oldu / öldü; He is dead and gone Artıq o, qəbirdədir;* **18.** keçmək, qəbul olunmaq; *What he says goes Onun təklifi keçir / qəbul olunur, O, nə deyirsə, o da keçir; This plan will not go Bu plan qəbul edilməyəcək;* **19.** cütləşmək; **20.** iştirak etmək *(hər hansı bir işdə);* **to ~ halves/ shares /snacks /fifty-fifty /snips** bərabər hüquqla iştirak etmək *(bir kəslə);* müəyyən məbləğdə pul/yatırım qoymaq; *How much do you go? Sən/Siz nə qədər qoyursan/qoyursunuz? He went a hundred dollars O, oyuna yüz dollar qoydu;* **21.** saxlamaq, qalmaq; *Butter goes better in the refrigerator Yağ soyuducuda daha yaxşı qalır;* **to be going to do *smth.*** bir şey etməyə hazırlaşmaq, bir şey etmək niyyətində /fikrində olmaq; *I am going to speak to her Mən onunla danışmaq fikrindəyəm; He is going to tell us a story O bizə bir əhvalat danışmağa hazırlaşır; She is going to spend her holidays at a rest-home O öz tətilini istirahət evində keçirmək niyyətindədir; It is going to rain Yağış yağacaq / gəlir;* **to ~ and do *smth.*** götürüb/gedib bir şeyi etmək; *Go and see Get bax; Go and shut the door Get qapını ört;* **to ~ and fetch *smth./smb.*** gedib bir şeyi/kəsi gətirmək, bir şeyin/kəsin dalınca getmək; *Go and fetch a piece of chalk Get/Gedin bir parça tabaşir gətir/gətirin;* **to ~ about *smth.* / doing *smth.*** bir şeylə məşğul olmaq, bir işə girişmək; **to ~ about *one's* business** öz işi ilə məşğul olmaq; **to ~ in for *smth.*** bir şeylə məşğul olmaq, bir şeylə həddindən artıq maraqlanmaq; **to ~ in for sports** idmanla məşğul olmaq; *What hobby do you go in for? Sənin/Sizin sevimli məşğuliyyətin/məşğuliyyətiniz nədir?; What game do you go in for? Sən/Siz hansı idman oyunları ilə məşğul olursan?/olursunuz?;* **to ~ against *smb.*** bir kəsin əleyhinə getmək/olmaq; *Fate goes against me Bəxtim özümə düşmən kəsilib; It goes against me Bu mənim əleyhimədir/ziddimədir;* **to ~ beyond**

*smth.* həddini aşmaq, səlahiyyətdən kənara çıxmaq; **to ~ beyond *one's* orders** səlahiyyət həddini aşmaq; **to ~ by appearance** zahiri görünüşünə görə fikir söyləmək; *I go by the barometer Mən barometrə əsaslanıram;* **to ~ after pleasure** kef dalınca qaçmaq; *He is going after Jane O, Ceynin dalınca qaçır/dalına düşüb;* **to ~ for nothing** dəyər-dəymezinə satılmaq; *The books went for nothing Kitablar dəyər-dəymazinə satıldı;* **to ~ through *smth.*** 1) bir şeyi diqqətlə, bənd-bənd araşdırmaq; *Let's go through the arguments again Gəl/Gəlin bütün dəlilləri bir də araşdıraq;* 2) dadmaq, acısını çəkmək, məruz qalmaq; *They went through many hardships Onlar çox çətinliklərə məruz qaldılar;* 3) xərcləyib qurtarmaq, axırına çıxmaq; *He quickly went through his fortune O, çox keçmədi ki, öz varidatının axırına çıxdı;* **to ~ without *smth.*** bir şeysiz keçinmək; **to ~ without supper** şam yeməksiz keçinmək; **to ~ without money** pulsuz keçinmək; **to ~ into rage** qəzəblənmək, qeyzlənmək, bərk hirslənmək; **to ~ under *smb.'s* name** bir kəsə aid edilmək, bir kəsin adına yazılmaq; *That play generally goes under the name of Shakespeare Bir qayda olaraq bu pyesi Şekspirə aid edirlər;* **to ~ to sea** dənizçi olmaq; **to ~ on/to stage** aktyor/artist olmaq; **to ~ on/to the streets** fahişə/qəhbə olmaq; **to ~ to school** məktəbə getmək, şagird olmaq; **to ~ to college/to university** kollecdə/universitetdə oxumaq, tələbə olmaq; **to ~ into the army** orduya/əsgərliyə getmək; **to ~ into business** işbaz olmaq; **to ~ into Parliament** Parlamentin üzvü olmaq; **to ~ about** 1) gəzişmək, var-gəl etmək; 2) boş-boş gəzmək; veyllənmək, ora-bura getmək; *I don't go about much anymore Mən daha ora-bura çox getmirəm;* 3) gəzmək, dolaşmaq (*şayiə haq.*); *A story is going about that... Şayiə gəzir ki...;* **to ~ ahead** 1) irəli getmək, irəliləmək; *Go ahead! İrəli!; He's going ahead fast O çox sürətlə irəli gedir / inkişaf edir; The Joneses are very go-ahead people; it's difficult to keep up with them Coneslər çox mütərəqqi adamlardırlar. Onlarla ayaqlaşmaq çətindir;* 2) davam etmək; *"May I start now?" "Yes, go ahead!" "İndi başlaya bilərəmmi," "Bəli, buyurun!";* **to ~ along** razılaşmaq; *I can't go along with you on that point Bu məsələdə mən səninlə/sizinlə razılaşa bilmərəm;* **to ~ at *smb.*** 1) bir kəsin üstünə cummaq/hücum etmək/hücum çəkmək; *They went at each other furiously Onlar qəzəblə bir-birinin üstünə cumdular;* 2) əlindən gələni etmək; *They were going at the job for all they were worth Onlar əllərindən gələn hər şeyi edirdilər ki, işlərini görsünlər;* **to ~ away** çıxıb getmək, tərk etmək; *He went away with my book O mənim kitabımı götürüb çıxıb getdi;* **to ~ back** 1) geri dönmək; qayıtmaq; **to ~ back to *one's* native land** öz vətəninə qayıtmaq; **to ~ back to a subject** əvvəlki mövzuya qayıtmaq; 2) geri getmək, pisləşmək, cırlaşmaq; *Those old trees are going back O qoca ağaclar get-gedə quruyur/cırlaşır;* 3) **(on, upon)** aldatmaq, öz sözünü geri götürmək, vədə xilaf çıxmaq; *He's not the sort of man who would go back on his word O öz sözünü geri götürən adamlardan deyil, O elə adam deyil ki, öz sözünü geri götürsün;* **to ~ behind** yenidən baxmaq, öyrənmək, araşdırmaq (*faktları*); **to ~ behind the evidence** şahid ifadəsini yenidən öyrənmək/araşdırmaq; **to ~ between** vasitəçilik etmək; **to ~ by** 1) ötüb keçmək; *Years went by İllər ötüb keçdi; Time went by slowly Vaxt yavaş-yavaş ötüb keçdi;* 2) yanından keçib getmək; 3) əldə rəhbər tutmaq, əməl etmək, məsləhətə qulaq asmaq; *I shall go entirely by what my solicitor says Mən vəkilimin dediklərinə tamamilə əməl edəcəyəm; That is a good rule to go by Əldə rəhbər tutmaq üçün o, yaxşı qaydadır;* **to ~ down** 1) batmaq; *The ship went down Gəmi batdı; The sun went down Gün batdı; This pill won't go down Mən bu həbi uda bilmirəm;* 2) yatmaq, zəifləmək (*külək, dəniz və s. haq.*); *The wind has gone down a little Külək bir az yatıb/zəifləyib;* 3) aşağı düşmək (*qiymət haq.*); *The price of eggs has gone down Yumurtanın qiyməti aşağı düşüb;* 4) məğlub olmaq; *Rome went down before the barbarian Roma barbarlar qarşısında məğlub oldu / çökdü;* 5) xatırlanmaq, adı tarixə düşmək; *He'll go down in history as a great statesman O, böyük dövlət xadimi kimi tarixə düşəcək;* 7) xəstələnmək; *Poor John – he has gone down with flu Yazıq Con – o, qriplə xəstələnib/qrip olub;* **to ~ for *smb.*** 1) bir kəsi gətirməyə getmək, bir kəsin dalınca getmək; *Shall I go for a doctor? Həkim gətirməyə gedimmi?;* 2) hücum etmək, üstünə cummaq; *The dog went for a postman as soon as he opened the garden gate Poçtalyon bağın qapısını açan kimi it onun üstünə cumdu;* **to ~ forward** irəliləmək; *The work is going forward well İş yaxşı irəliləyir / gedir;* **to ~ in** 1) girmək, daxil olmaq; *The cork is too big; it won't go in Tıxac çox böyükdür, girməyəcək; She went in to cook the dinner O, içəri keçdi ki, nahar hazırlasın;* 2) buluda girmək, buludla üzü tutulmaq; *The sun went in and it grew rather dark Bulud günəşin üzünü tutdu və hava xeyli qaraldı;* **to ~ in for** iştirak etmək; *He is going in for motor-race. Are you also going in? O, motosiklet yarışında iştirak edir. Sən/Siz də iştirak edəcəksənmi?/edəcəksinizmi?; He is going in for examination O, imtahanda iştirak edir/imtahan verir;* **to ~ off** 1) səhnəni tərk etmək (*tamaşa zamanı*); *Hamlet goes off Hamlet səhnəni tərk edir;* 2) atəş açmaq, açılmaq (*silah haq.*); *The*



*gun went off by accident Tüfəng təsadüfən açıldı;* 3) dönmək, turşumaq, çürümək, xarab olmaq; *The milk has gone off Süd turşuyub/çürüyüb; Meat and fish go off quickly in hot weather Ət və balıq isti havada tez xarab olur;* 4) bayılmaq, uyumaq; *She went off into faint O bayıldı;* 5) huşa gəlmək, ayılmaq; *Hasn't the baby gone off yet Körpə hələ huşa gəlməyib/ayılmayıb?;* 6) marağı sönmək, maraq göstərməmək; *Jane seems to have gone off Peter Görünür, Ceyn daha Piterlə maraqlanmır; I've gone off beer Pivə məni daha maraqlandırmır, Daha pivədən xoşum gəlmir;* 7) itirmək, pisləşmək; *Her voice is going off Onun səsi get-gedə pisləşir; Her beauty has gone off O, gözəlliyini itirib; The cow has gone off milk İnək südünü itirib/azaldıb;* **to ~ on** 1) davam etmək; *Go on, I am listening Davam et /edin, mən qulaq asıram; Go on with your work İşləməkdə ol/olun, İşinə/İşinizə davam et/edin;* 2) baş vermək; *What is going on here? Burda nə olub? / nə baş verib?;* 3) özünü aparmaq (*biabırçı, pis*); *Don't go on like that! Özünü belə pis aparma!; If you go on like this, you'll be thrown out Əgər özünü/özünüzü belə biabırçı aparsan/aparsanız, səni/sizi atacaqlar bayıra;* 4) yerində olmaq, yaramaq, düz ölçüsündə olmaq; *These shoes won't go on Bu ayaqqabı ayağıma olmur;* 5) səhnəyə çıxmaq; *She doesn't go on until Act Two O, ikinci pərdəyə qədər səhnəyə çıxmır;* **to ~ on for** yaxınlaşmaq (*vaxt, yaş haq.*); *She is going on for twenty O, iyirmi yaşa yaxınlaşır; It's going on for 5 o'clock Tezliklə saat 5 olacaq;* **to ~ on at** söymək, danlamaq, təhqir etmək; *She goes on at her husband continually O müntəzəm olaraq ərini təhqir edir:;* **to ~ out** 1) çıxmaq (*bayıra*); *She was dressed to go out O, bayıra çıxmaq üçün geyinmişdi; Out you go! Çıx bayıra!;* 2) sönmək; *The fire has gone out Ocaq sönüb; There was a power cut and all the lights went out Enerji təchizatı kəsildi və bütün işıqlar söndü;* 3) dəbdən düşmək; *Have boots gone out? Çəkmələr dəbdən düşübmü?;* 4) tətilə çıxmaq, qiyam qaldırmaq; *Are we likely to gain anything by going out on strike? Görəsən tətil etməklə biz bir şeyə nail olacağıqmı?;* 5) öz ölkəsindən çıxıb getmək, öz ölkəsini tərk etmək; *He couldn't get work at home, so went out to Australia O öz vətənində iş tapa bilmədiyindən çıxıb Avstraliyaya getdi;* 6) sevmək, ürəyi bir kəslə olmaq; *Our hearts go out to those poor children orphaned by war Bizim ürəklərimiz müharibənin yetim qoyduğu uşaqlarladır;* **to ~ round** 1) kifayət qədər olmaq; *There aren't enough apples to go round Alma hamıya kifayət etməyəcək; There isn't enough whisky to go round Viski hamıya çatmayacaq;* 2) baş çəkmək, görməyə getmək; *We're going round to my mother's at the weekend Həftənin sonu biz anamgilə gedib ona baş çəkəcəyik;* **to ~ togeter** yaraşmaq, *məc.* tutmaq; *These colours don't go together Bu rənglər bir-birinə yaraşmır, Bu rənglər bir-birini tutmur; Do my green shirt and my blue jeans go together?; Mənim yaşıl köynəyim göy cins şalvarıma yaraşırmı?* **to ~ under** 1) batmaq; 2) müflis olmaq; *The firm will go under unless business improves İşlər yaxşılaşmasa, firma müflis olacaq/ batacaq;*

◊ **to ~ to bed / to sleep** yatmaq, yıxılıb yatmaq; **to ~ to bye-bye** gedib bay-bay eləmək (*uşaqlar haq.*); **to ~ for a soldier** əsgər olmaq; **to ~ to pieces/rack and ruin/smash** parça-parça olub dağılmaq; **to ~ a long/good/ great way** 1) uzun yol keçmək; 2) həddini aşmaq; 3) kifayət etmək; 4) davamlı olmaq; *She makes a little money go a long way O, bir az pulla çoxlu şey alır; A little of this paint goes a long way Bu boyanın bir azı xeyli yeri rənglənməyə kifayət edir;* **to ~ dry** spirtli içkiləri satmağı qadağan etmək; spirtli içkilərdən imtina etmək; **to ~ into mourning** yasa batmaq; **to ~ in fear** qorxu içərisində yaşamaq; **to ~ in rags** cır-cındır içində gəzmək; **to ~ green with envy** paxıllıqdan gömgöy göyərmək; **to ~ wet** spirtli içkilərin satışına icazə vermək; **to ~ bail** *hüq.* zamin olmaq; **to ~ over to the majority** dünyasını dəyişmək; **to ~ with the current/the tide /the stream/the crowd** axınla getmək, axına qoşulmaq; **to ~ with the times/the tides** zamanla ayaqlaşmaq; **to ~ against the stream /the tide** axına qarşı getmək, zamanla ayaqlaşmamaq; **to ~ out of *one's* mind** ağlı qaçmaq; dəli olmaq, ağlını itirmək; **to ~ to blazes /to hell/to pot/to the devil/to the dogs** var-yoxdan çıxmaq, dilənçi halına/it kökünə düşmək, məhv olmaq, iflas olmaq, sınıq çıxmaq, alt-üst olmaq, **to ~ it blind** kor-koranə hərəkət etmək; *Go to blazes! / to bath! / to hell! /to pot! / to the devil! / to thunder! Rədd ol!, İtil başımdan!; He can go hang O rədd olub gedə bilər; Go fly a kite!, Go jump in the lake!, Go lay an egg!, Go lay a brick!, Go sit on a tack!, Rədd ol!, İtil!, Get atdır!, Sürüş burdan!, Açıl başımdan!; There it goes! Bura bax!/baxın!; Qulaq as/asın! (diqqəti cəlb etmək üçün);* **to ~ scot-free** sudan quru çıxmaq; *How goes the world with you? İşlər necə gedir?; It goes without saying Söz yox ki, əlbəttə, özlüyündə aydındır, şübhəsiz; How goes it? Necəsən?;* **to ~ a wool-gathering** huşsuz/dalğın olmaq, səmalarda/göylərdə uçmaq (*həyatdan uzaq olmaq*); **to ~ round like a horse in a mill** ≅ *Çevir tatı, vur tatı;* **to ~ off like hot cakes** əldən qapılmaq, əlüstü alınıb qurtarmaq; **to ~ over like nine-pins** bir-birinin ardınca sıradan çıxmaq / xarab olmaq

*Goodness gracious! Gracious me!, Gracious heaven!, Gracious mercy!, Gracious powers! Aman allah!, Allah özün saxla!, Allah özün rəhm et!, Ey yerin-göyün ağası!, Pərvərdigar!, Ey Ulu Tanrı!*

**graciously** ['greıʃəslı] *adv* 1. lütfkarlıqla, xeyirxahlıqla, təvəccöhlə; 2. gülərüzlə, iltifatla, mehribanlıqla; **to give** *one's* **consent** ~ mehribanlıqla/gülərüzlə razılaşmaq / razılığını vermək

**gradate** [grə'deıt] *v* 1. sezilmədən rəngin bir çalarından digərinə keçmək *(rəssamlıqda)*; 2. *kim.* buxarlanma vasitəsilə məhlulu müəyyən qatılıq dərəcəsinə çatdırmaq

**gradation** [grə'deıʃn] *n* 1. tədricən bir vəziyyətdən başqa bir vəziyyətə keçmə; 2. sezilmədən rəng çalarlarının dəyişməsi; 3. sıra, dərəcə, tədricilik, dərəcələrə bölmə; 4. *pl* keçid pillələri; 5. *dilç.* ablaut, saitlərin əvəzlənməsi

**grade**[1] [greıd] *n* 1. dərəcə, pillə; 2. rütbə; **~s of military rank** hərbi rütbələr; *A major is one grade higher than a captain Mayor kapitandan bir rütbə yüksəkdir;* 3. keyfiyyət, növ, sort; **a poor ~ of oats** yulafın pis növü/çeşidi; *Potatoes are sold in grades, and grade-A potatoes are of the best quality Kartof çeşidlərə görə satılır və A-çeşidli kartof ən yüksək keyfiyyətli kartof hesab edilir; This pupil has a high grade of intelligence Bu şagird yüksək ağıl səviyyəsinə malikdir;* 4. *amer.* sinif *(məktəbdə); An elementary school in the US has eight grades and it is called a "grade school" ABŞ-da ibtidai məktəbin səkkiz sinif dərəcəsi var və bu məktəb "qreyd skul" adlanır; He is in the fifth grade now İndi o, beşinci sinifdədir;* 5. *amer.* qiymət; **to give** ***smb.*** **the highest ~** bir kəsə ən yüksək qiymət vermək; 6. *amer. k.t.* cütləşdirmə vasitəsilə cinslərin yaxşılaşdırılması; 7. eniş və ya yoxuş; **down ~** eniş; **up ~** yoxuş; **on the down ~** tənəzzül, enmə, azalma; **on the up ~** tərəqqi, yüksəliş, qalxma, artım; *The business is on the up grade Biznes inkişaf etməkdədir / yüksəlişdədir*
◊ **to make the ~** çətinliklərə sinə gərib uğur əldə etmək; **at ~** eyni səviyyədə

**grade**[2] [greıd] *v* 1. yerləşdirmək, düzmək *(rütbəsindən, dərəcəsindən, qrupundan asılı olaraq)*; 2. növlərə ayırmaq, çeşidləmək; **to ~ cotton** pambığı növlərə ayırmaq/çeşidləmək; **to ~ pupils** şagirdləri siniflərə bölmək; 3. *amer.* qiymət vermək, qiymətləndirmək; 4. tədricən dəyişmək; 5. *k.t.* cütləşdirmə vasitəsilə cinsləri yaxşılaşdırmaq; 6. torpaq işləri aparmaq; hamarlamaq; 7. *dilç.* ablauta görə dəyişmək *(saitləri)*

**grade-school** ['greıdskul] *n amer.* ibtidai məktəb *(həm də* **the grades***)*

**gradient**[1] ['greıdjənt] *n* 1. *fiz.* qradiyent; 2. meyl; 3. yamac, dağın döşü; 4. aşağı enmə *(barometr əqrəbi haq.)*

**gradient**[2] ['greıdjənt] *adj* hərəkət edən, addımlayan; **~ automats** addımlayan avtomatlar

**gradual** ['grædʒuəl] *adj* 1. tədriclə, yavaş-yavaş; **a ~ increase in the cost of living** istehlak dəyərinin tədricən / yavaş-yavaş artması; 2. ardıcıl, bir-birinin ardınca gələn, sistemli

**gradualism** ['grædʒuəlızm] *n* 1. sosial islahatların tədricən həyata keçirilməsi haqqında təlim; 2. *amer. tar.* quldarlığın ləğvində tədricilik tələbi / çağırışı

**gradually** ['grædʒuəlı] *adv* tədriclə, tədricən, yavaş-yavaş

**graduate**[1] ['grædʒuət] *n* 1. ali məktəb məzunu; *He is an Oxford graduate O, Oksford universitetinin məzunudur;* 2. *amer.* istənilən tədris müəssisəsini bitirmiş şəxs; **high school ~s** orta məktəb məzunları; **~ members of the University** universitetin professorları və müəllimləri; **a ~ school** *amer.* aspirantura; **a ~ student** aspirant; 3. menzurka

**graduate**[2] ['grædʒueıt] *v* 1. ali məktəbi bitirib bakalavr dərəcəsi almaq; *He graduated from Oxford O, Oksford universitetini bitirdi;* 2. *amer.* istənilən tədris müəssisəsini bitirmək; *He graduated in Law O, hüquq fakültəsini bitirdi;* **to ~ from a high school /the Boston Cooking School** orta məktəbi / Boston aşpazlıq məktəbini bitirmək; 3. buraxmaq *(universitet, kollec və s. barədə)*, diplom/dərəcə vermək; *The University graduated 350 students last year Universitet keçən il 350 məzun buraxıb;* 4. ardıcıllıqla /müəyyən bir prinsip əsasında yerləşdirmək; 5. dərəcələrə bölmək/ayırmaq; **a ruler ~d in both inches and centimetres** həm düymlərə, həm də santimetrlərə bölünmüş xətkeş; 6. *biol.* tədricən dəyişmək, bir vəziyyətdən digər bir vəziyyətə keçmək; 7. *kim.* mayeni qatılaşdırmaq *(buxarlanma vasitəsilə)*

**graduation** [ˌgrædʒu'eıʃn] *n* 1. ali təhsil müəssisəsini bitirib bakalavr dərəcəsi alma; *What shall you do after graduation? Təhsilini/Təhsilinizi başa vurduqdan sonra nə edəcəksən? / edəcəksiniz?;* 2. *amer.* hər hansı bir tədris müəssisəsini bitirmə; 3. *amer.* diplom və ya elmi dərəcə təqdim etmə mərasimi; 4. sıra, dərəcə; 5. dərəcələrə bölmə / ayırma; kalibrləmə; 6. mayeni qatılaşdırma, buxarlandırma; **~ gowns /dresses** diplom təqdimetmə mərasimində qızların geydiyi paltar

**graft**[1] [gra:ft, græft] *n* I 1. *bot.* qələm/çilik peyvəndi, peyvənd, calaq *(bitkilərdə)*; 2. *tib.* köçürmək üçün toxuma/sümük parçası və s.; **to use skin from the back as a ~** kürəkdən götürülmüş dərini köçürmə üçün istifadə etmək; 3. *tib.* toxumanın köçürülməsi əməliyyatı; **to make a ~** toxumanı köçürmək

**graft** [gra:ft, græft] *n* II 1. rüşvət, qeyri-qanuni gəlir; 2. rüşvətxorluq, zəhmətsiz gəlir



**graft**[2] [gra:ft, græft] *v* I 1. **(in, into, on, upon)** *k.t.* peyvənd/calaq etmək/vurmaq, qələm calağı vurmaq; **to ~ by approach** budaqları yaxınlaşdıraraq bir-birinə calaq etmək; 2. *tib.* canlı toxumanı köçürmək; **to ~ skin** dəri köçürmək

**graft** [gra:ft, græft] *v* II rüşvət almaq, əyri yollarla əldə edilmiş gəlirdən istifadə etmək

**grafter** ['gra:ftəʳ] *n* I 1. *k.t.* calaq qələmi; 2. *bot.* peyvəndlik bitki; 3. bağ bıçağı

**grafter** ['gra:ftəʳ] *n* II 1. rüşvətxor; 2. fırıldaqçı, kələkbaz, lotu

**grafting** ['gra:ftıŋ] *n* 1. peyvəndləmə, calaq etmə/vurma; **bark ~** qabıqaltı calaqetmə; **~ compound** calaqetmədə istifadə olunan sürtkü/suvaq; **~ wax** calaqetmədə istifadə olunan mum; 2. *tib.* toxuma köçürmə

**graham** ['greıəm] *n adj* 1. buğda unundan hazırlanmış; **~ bread** "qreyhem" çörəyi; 2. diri/iri un; **~ flour** iri/diri üyüdülmüş buğda unu *(kəpəyi tam təmizlənməmiş)*

**grain**[1] [greın] *n* 1. taxıl, dən; **wheat ~** buğda; **ripe ~** yetişmiş taxıl; **a ship with a cargo of ~** taxıl yüklənmiş gəmi; **to cut / to reap ~** taxılı yığmaq / biçmək; 2. iri üyüdülmüş un; **coarse-broken ~** yarma; 3. *pl* barda *(araq və çaxır cecəsi)*; 4. toxum, dən, toxumcuq; 5. zərrə, dənəcik; **~s of gold** qızıl zərrələri/dənəcikləri; **to eat up every ~ of rice** düyünü axırıncı dənəsinə qədər yeyib qurtarmaq; 6. qran *(çəki vahidi = 0,065 qr; el arasında bir arpa ağırlığında)*; 7. barama toxumu, barama qurdunun yumurtası; 8. ağacın quruluşu; 9. damar, lif, tel *(ağacda)*; 10. xarakter tərzi, xasiyyət; 11. rəng, boya; koşenil *(qırmızı boya)*; **to dye in ~** boya ilə rəngləmək;
◊ **ass/fool in ~** tamam gic, eşşəyin yekəsi; **knave/rogue in ~** qatı kələkbaz/lotu

**grain**[2] [greın] *v* 1. xırdalamaq, parçalamaq, doğramaq; 2. dənə halına gətirmək, kristallaşdırmaq; kristallaşmaq; 3. dərinin yununu təmizləmək; 4. ağac və ya mərmər rəngində rəngləmək

**grain-binder** ['greınˌbaındəʳ] *n k.t.* dərzbağlayan maşın

**grain-cleaner** ['greınˌkli:nəʳ] *n k.t.* taxıltəmizləyən maşın; taxıltəmizləyən

**grain-dryer** ['greınˌdraıəʳ] *n k.t.* taxılqurudan maşın / cihaz

**grain-grower** ['greın'grouəʳ] *n* əkinçi, taxıl becərən

**grains** [greınz] *n pl* harpun, çəngəl *(böyük dəniz heyvanlarını ovlamaq üçün nizə; qırmaq)*

**grain-separator** ['greınˌsepəreıtəʳ] *n k.t.* taxıltəmizləyən/taxılçeşidləyən maşın

**grain-soap** ['greınsoup] *n* əla sabun

**grain-tank** ['greıntæŋk] *n k.t.* taxıl/dən bunkeri

**grain-treatment** ['greınˌtri:tmənt] *n k.t.* taxılın dərmanlanması

**grain-whisky** ['greınˌwıskı] *n* arpa arağı

**grainy** ['greını] *adj* 1. nahamar, kələ-kötür; 2. dənəli, dənəvər

**gram** [græm] *n* I = **gramme**

**gram** [græm] *n* II kiçik türk noxudu

**grammar**[1] ['græməʳ] *n* 1. qrammatika *(elm)*; **historical /comparative/general ~** tarixi / müqayisəli/ümumi qrammatika; 2. dilin qrammatik sistemi; *German grammar is said to be more difficult than English grammar Alman dili qrammatikası ingilis dili qrammatikasından çətin / mürəkkəb hesab olunur;* 3. qrammatika dərsliyi; **a modern English ~** müasir ingilis dili qrammatikası; 4. qrammatik vərdişlər; düzgün /səhvsiz nitq *(qrammatik baxımdan); He speaks fluently, but his grammar is very bad O sərbəst danışır, ancaq çoxlu qrammatik səhvlərə yol verir*

**grammar**[2] ['græməʳ] *adj* qrammatika, qrammatik; **a ~ book/lesson** qrammatika kitabı/dərsi; **a ~ rule** qrammatik qayda

**grammarian** [grə'meərıən] *n* 1. qrammatika mütəxəssisi; 2. filoloq, dilçi

**grammar-school** ['græməsku:l] *n* 1. klassik orta məktəb; 2. *tar.* latın qrammatikası məktəbi; 3. *amer.* orta məktəbin 5-8-ci sinifləri

**grammatical** [grə'mætıkəl] *adj* 1. qrammatik; **~ gender** qrammatik cins; **~ meaning** qrammatik məna; 2. qrammatik cəhətdən düzgün; **~ speech** qrammatik cəhətdən düzgün nitq

**gramme** [græm] *n* qram *(çəki vahidi)*

**grammophone** ['græməfoun] *n* 1. qrammofon; 2. patefon

**grampus** ['græmpəs] *n zool.* 1. şimal delfini *(balinalar qrupundan dəniz məməlisi)*; 2. tövşüyən/ağır nəfəs alan adam; **to blow /to snore like a ~** ağır nəfəs almaq, ləhləmək, tövşümək; 3. böyük maşa, qısqac

**granary** ['grænərı] *n* 1. anbar, taxıl anbarı; 2. taxıl mənbəyi, taxılçılıq rayonu

**grand**[1] [grænd] *n* 1. royal *(musiqi aləti)*; 2. *amer. jarq.* min dollar; **five ~** beş min dollar

**grand**[2] [grænd] *adj* 1. əzəmətli, möhtəşəm, nəhəng, qüdrətli, təntənəli; **~ spectacle** möhtəşəm tamaşa; **~ mountain** nəhəng dağ; *The view from here is grand Mənzərə buradan möhtəşəmdir;* 2. böyük, ulu; **~ general** böyük sərkərdə; **Grand Vizier** vəzir/baş nazir *(Türkiyədə)*; **Grand Turk** türk sultanı; 3. mühüm, ciddi; **~ question** mühüm məsələ; **a ~ mistake** ciddi səhv; 4. əsas, baş; **~ entrance** əsas giriş; 5. nəcib, alicənab; *Lincoln had a grand character Linkoln çox nəcib xarakterli /alicənab insan olub;* **~ conception** nəcib ideya; 6. iddialı, lovğa; **~ air** lovğa görkəm; *He puts on a very grand manner / air O özünü çox təkəbbürlü aparır;* 7. təmtəraqlı, dəbdəbəli, calallı; **~ clothes** təmtəraqlı geyimlər; 8. böyük; **~ orchestra** böyük simfonik orkestr; 9. yekun.

ümumi; ~ **total** ümumi məbləğ; 10. valehedici, heyranedici, məftunedici, çox gözəl, cazibəli, cəzbedici, əla; *We had a grand time Biz vaxtımızı əla keçirdik; What grand weather! Necə gözəl havadır!;* **to feel ~** özünü əla hiss etmək; *It will be grand if you can come Əgər gələ bilsən, çox yaxşı/əla olar;*

◊ **Grand Cross** Böyük xaç ordeni; **Grand Old Party** *amer.* Respublikaçılar partiyası; **Grand Tour** təhsili tamamlamaq üçün Avropaya getmə / səfər etmə

**grandad** ['grændæd] *n* baba

**grandam, grandame** ['grændæm, -deım] *n* = **1. grandmother**; 2. qarı, qoca arvad; 3. qiybətçi, xəbərçi

**grand-aunt** ['grænа:nt] *n* atanın / ananın bibisi / xalası

**grand-child** ['grænt∫aıld] *n* (*pl* **-children** [t∫ıldrən]) nəvə

**grand-daughter** ['græn'dɔ:tə$^r$] *n* nəvə *(qız)*

**grandee** [græn'di:] *n* 1. qrand, 2. əyan, ağa, kübar *(İspaniya və Portuqaliyada yüksək rütbəli alicənab şəxs)*

**grandeur** ['grændʒə$^r$, 'grænʒə$^r$] *n* 1. calal, dəbdəbə, təmtəraq, əzəmət; **the ~ of the nature** təbiətin calalı/əzəməti; 2. ad-san, nəciblik, əsillik; **~ of design** niyyətin nəcibliyi

**grandfather** ['grænd.fa:ðə$^r$] *n* 1. baba; 2. ulu baba, cədd-əba *(ata tərəfdən)*;

◊ **~'s clock** hündür böyük korpuslu saat

**grandfatherly** ['grænd.fa:ðəlı] *adj* 1. ata qayğısı/nəvazişi göstərən, mehriban, nəvazişli; 2. babaya oxşayan, baba kimi

**grandiloquence** [græn'dıləkwəns] *n* təmtəraqlılıq, dəbdəbəlilik, ibarəlilik

**grandiloquent** [græn'dıləkwənt] *adj* 1. təmtəraqlı, dəbdəbəli; **written in ~ style** təmtəraqlı üslubda yazılmış; 2. ibarəli, dəbdəbəli ibarələrlə danışan; **a ~ speaker** ibarəli danışan natiq

**grandiose** ['grændıous] *adj* 1. böyük, əzəmətli, möhtəşəm, nəhəng; **~ building** əzəmətli bina; 2. təmtəraqlı, təşəxxüslü, lovğa; **~ manners** təşəxxüslü əda / xasiyyət

**grandiosity** [.grændı'ɔsıtı] *n* 1. böyüklük, əzəmət, möhtəşəmlik; 2. təmtəraq, dəbdəbə, əda, təşəxxüs

**grandma** ['grænma:] *n* = **grandmamma**

**grandmamma** ['grænmə'ma:] *n* nənə

**Grand Master** ['græn'ma:stə$^r$] *n* 1. qrossmeyster *(cəngavər cəmiyyətləri başçısı)*; 2. *şahm.* qrossmeyster

**grandmother**[1] ['græn.mʌðə$^r$] *n* 1. nənə; 2. ulu nənə *(ana tərəfdən)*;

◊ **to teach** *one's* **~ (to suck eggs)** özündən böyüklərə nəsihət vermək; ≅ *Bala sərçə ana sərçəyə cik-cik öyrədir*

**grandmother**[2] ['græn.mʌðə$^r$] *v* əzizləmək, nazını çəkmək; ərköyün böyütmək

**grandmotherly** ['græn.mʌðəlı] *adj* 1. ana nəvazişi göstərən, mehriban, nəvazişli, xeyirxah, əziz; 2. nənəyə oxşayan, nənə kimi; 3. əhəmiyyətsiz, çox az, boş *(qanunvericilik, hökumət və s. haq.)*

**grand-nephew** ['græn.nevju:] *n* nəticə *(oğlan)*

**grand-niece** ['græn.ni:s] *n* nəticə *(qız)*

**grandpa** ['grænpa:] *n* = **grandpapa**

**grandpapa** ['grænpə.pa:] *n* baba

**grandparents** ['græn.peərənts] *n* nənə və baba

**grand piano** ['grænd'pjænou] *n* royal

**grandson** ['grænsʌn] *n* nəvə *(oğlan)*

**grandstand**[1] ['grænd'stænd] *n* tribuna *(stadionda, tamaşa yerlərində və s.)*

**grandstand**[2] ['grænd'stænd] *adj d.d.* ən yaxşı, nümunəvi; **~ play** tamaşaçılara xoş gəlmək üçün çalınan / ifa olunan

**grandstand**[3] ['grænd'stænd] *v d.d.* 1. özünü yaxşı göstərməyə çalışmaq; 2. tamaşaçılara təsir etmək üçün çalmaq; tamaşaçıları ələ almaq üçün çalmaq

**grand-uncle** ['grænd.ʌŋkl] *n* əmi/dayı/bibi / xalaoğlunun / xalaqızının babası

**grange** [greındʒ, greınʒ] *n* şəhər kənarında bağlı-bağçalı, təsərrüfat tikililəri olan ev / xutor

**granger** ['greındʒə$^r$] *n* 1. fermanı idarə edən şəxs; 2. fermerlər birliyinin üzvü; 3. fermer; **~ road** Amerikanın qərb ştatlarından taxıl daşınması üçün tikilmiş dəmiryol xətlərindən biri; **~ shares** taxıldaşıyan dəmiryol şirkətinin səhmləri; **~ legislation** *(böyük)* fermerlərin maraqlarının qorunması haqqında qanunlar

**granger's cattle** ['greındʒəz.kætl] *n k.t.* ətlik və südlük mal-qara

**granite** ['grænıt] *n* 1. qranit *(bərk süxur)*; **as hard as ~** qranit kimi bərk; 2. *məc.* tərslik, inad, inadcıllıq; 3. sərtlik *(xarakter və s. haq.)*; 4. qranit məmulatı; 5. qırmızımtıl rəng; **~ stab** sal qranit, qranit lövhə;

◊ **the Granite City** Aberdin şəhəri; **the Granite State** *amer.* "Qranit Ştatı" *(Nyu-Hempşir ştatı)*; **to bite on ~** nahaq yerə güc sərf etmək

**granite-ware** ['grænıtweə$^r$] *n* 1. qranit rəngində rənglənmiş məmulat; 2. minalanmış dəmir məmulat

**granitic** ['grænıtık] *adj* 1. qranit; 2. bərk, möhkəm

**grannie** ['grænı] *n* = **granny**

**granny** ['grænı] *n* 1. nənə, nənəcan, nənəciyəz; 2. qarı, qoca arvad; 3. *amer.* səfeh/ daim vurnuxan qadın; 4. *hərb. jarq.* ağır artilleriya;

◊ **~ knot** etibarsız düyün, "arvad" düyünü

**grant**[1] [gra:nt] *n* 1. hədiyyə, bəxşiş, bağışlama; **a ~ of lands** torpaqların bağışlanması; **to bestow / to confer a ~ on** ***smb.*** bir şeyi kiməsə hədiyyə vermək / bağışlamaq; 2. *hüq.* bağışlama, hədiyyə etmə; hüququn verilməsini təsdiq edən sənəd, hədiyyəni təsdiq edən sənəd, əmlakın



müsadirə edilməsi; 3. dotasiya, maliyyə yardımı; 4. *pl* təqaüd, stipendiya; 5. razılıq, güzəşt, icazə; **the ~ or refusal of...** bir şeyə razılıq və ya ondan imtina

**grant**[2] [gra:nt] *v* 1. bağışlamaq, hədiyyə etmək; **to ~ lands** torpaq sahəsi bağışlamaq; **to ~ rights** hüquq vermək; 2. dotasiya, maliyyə yardımı vermək; **to ~ an allowance of...** ...həcmdə pul təminatı müəyyən etmək; *He was granted a pension Ona təqaüd təyin edildi;* 3. icazə / razılıq vermək; 4. təmin etmək *(xahişi)*; **to ~ request** xahişi yerinə yetirmək; **to ~ a petition** ərizəni təmin etmək; 5. hesab / güman/ehtimal etmək, bir şeyin düzgünlüyünü təsdiq etmək; *I grant the truth of what he says Mən onun dediyinin doğru olduğunu təsdiq edirəm; I grant that he is honest Mən təsdiq edirəm ki, o, təmiz adamdır;* **to ~ that smb. is right** bir kəsin haqlı olmasını güman etmək; *Granting for a moment that it really happened Bir anlığa güman edək ki, bu doğrudan da baş verib;* **to take for ~ed** bir şeyi sübut edilmiş hesab etmək; *I grant you the force of that argument Mən sizin dəlilinizin ədalətli olduğunu qəbul edirəm*

**grantee** [gra:n'tı:] *n hüq.* bir şey alan şəxs; hədiyyə / ənam verilən şəxs

**grant-in-aid** ['grantın'eıd] *n* 1. *(pl* **grants-** [gra:nts-] dotasiya, maliyyə yardımı; 2. yerli özünüidarə təşkilatlarına məqsədli maliyyə yardımı

**grantor** ['gra:ntə$^r$] *n hüq.* hədiyyə / bəxşiş verən

**granular** ['grænjulə$^r$] *adj* dənəvər, dən-dən, dənəli, dumur-dumur

**granulate** ['grænjuleıt] *v* 1. xırdalamaq, parçalamaq, doğramaq; 2. dənələmək, dən-dən /dənəvər etmək; 3. *tib.* təzə toxumalarla örtülmək *(yara haq.)*, normal bitişmək *(təzə toxumalar haq.)*

**granulated-sugar** ['grænjuleıtıd'∫ugə$^r$] *n* şəkər tozu

**granulation** [.grænju'leı∫n] *n* 1. qranulyasiya; 2. dən-dən etmə, xırdalama, dənəvərləşdirmə; 3. *tib.* yaranın tədricən təzə toxumalarla örtülməsi / bitişməsi

**granule** ['grænju:l] *n* qranula, dənə, dənəcik

**grape**[1] [greıp] *n* 1. *bot.* üzüm; **white/dark/ purple/golden ~** ağ/ qara/ çəhrayı/ qızılı üzüm; **a bunch of ~s** üzüm salxımı; **to cut ~** üzüm yığmaq; **the juice of the ~** üzüm şirəsi, şərab; 2. üzüm giləsi; 3. tənək, meynə;

◊ *The grapes are sour* ≅ *Pişiyin ağzı ətə çatmayanda iylənib deyər, Əli ətə çatmayan bu gün orucam deyər*

**grape**[2] [greıp] *adj* üzüm; **~ juice/must** üzüm şirəsi; **~ pomace** üzüm cecəsi

**grape-cold** ['greıpkould] *n tib.* qızdırma, titrətmə

**grape-cure** ['greıpkjuə$^r$] *n* üzümlə müalicə

**grape-fruit** ['greıpfru:t] *n* qreypfrut *(subtropik meyvə; meyvə ağacı)*

**grape-house** ['greıphaus] *n* üzüm oranjereyası, üzüm yetişdirmək üçün şüşəbənd

**grape-louse** ['greıplaus] *n (pl* **-lice** [-laıs]) üzüm mənənəsi / biti

**grape-shot** ['greıp∫ɔt] *n hərb.* 1. kortec *(içi xırda güllələrlə doldurulmuş top gülləsi)*; 2. iri qırma

**grape-stone** ['greıpstoun] *n* üzüm çəyirdəyi

**grape-sugar** ['greıp.∫ugə$^r$] *n* üzüm şəkəri, qlükoza

**grape-vine** ['greıpvaın] *n* I tənək, meynə

**grape-vine** ['greıpvaın] *n* II 1. siqnalların köməyilə məlumat vermə sistemi; rabitə sistemi; məxfi rabitə sistemi; 2. saxta / uydurulmuş şayiə; təsdiq olunmamış məlumat / xəbər

**grape-worm** ['greıpwə:m] *n zool.* yarpaqbükən tırtılın sürfəsi

**grapeys** ['græpız] *n* delfin əti

**graph** [græf] *n* qrafik, diaqram, əyri; **~ paper** millimetrlik kağız

**graphic** ['græfık] *adj* 1. qrafik, təsviri; **~ arts** təsviri incəsənət; 2. qrafik, cizgi və ştrixlərlə təsvir edilmiş; **~ representation** qrafik təsvir/təqdimat; 3. əyani, mənzərəli, gözəl, aydın

**graphically** ['græfıkəlı] *adv* 1. qrafik olaraq; 2. əyani, canlı, gözəl, bədii surətdə

**graphite** ['græfaıt] *n* qrafit

**graphology** [græ'fɔlədʒı] *n* 1. qrafologiya; 2. xəttin öyrənilməsi

**grapnel**[1] ['græpnəl] *n* kiçik lövbər, drek, qarmağı olan lövbər

**grapnel**[2] ['græpnəl] *v* qarmaqla ilişdirmək, qarmaqlamaq

**grapple**[1] ['græpl] *n* 1. = **grapnel**[1]; 2. vuruşma, döyüşmə; əlbəyaxa, pəncələşmə

**grapple**[2] ['græpl] *v* 1. əlbəyaxa olmaq, tutuşmaq, caynaqlaşmaq, pəncələşmək; **to ~ with enemy** düşmənlə əlbəyaxa olmaq; 2. ilişmək, yaxınlaşmaq *(bir-birinə)*; 3. həll etməyə cəhd etmək /çalışmaq *(məsələni, tapşırığı və s.)*; **to ~ with a task/a problem** tapşırığı/problemi həll etməyə çalışmaq; 4. *id.* güləşmək; qurşaq tutmaq, qapışmaq; *The wrestlers grappled together Güləşçilər /Pəhləvanlar möhkəm tutuşdular*

**grapple-shot** ['græpl∫ɔt] *n dən.* imdad fişəngi *(xilasedici siqnal)*

**grapy** ['greıpı] *adj* 1. üzümə oxşayan *(forma və dadına görə)*; 2. dəmrov tutmuş *(at haq.)*

**grasp**[1] [gra:sp] *n* 1. bərk yapışma / tutma / sıxma; **iron ~** bərk / möhkəm tutma; 2. hökmü altında /ixtiyarında/əlində olma; **to be in the ~ of enemy** düşmənin əlində olmaq; *If he comes into my grasp... Əgər o, əlimə düşsə...;* 3. dərhal anlama / başa düşmə qabiliyyəti; **to have a thorough ~ of the problem** problemi dərindən anlamaq / başa düşmək; 4. qulp, sap, tutacaq, dəstək;

◊ **beyond** *one's* **~** əlçatmaz, bir kəsin dərk

edə/anlaya bilməyəcəyi şey; *It is beyond my grasp Bu mənim anlaya biləcəyim şey deyil;* **to slip from / out of** ***one's*** **~ 1)** sürüşüb aradan çıxmaq, yox olmaq; 2) bir kəs üçün əlçatmaz olmaq

**grasp**[2] [gra:sp] *v* **1.** tutmaq, yapışmaq, yaxalamaq; sıxmaq *(əlində)*; **to ~** ***smb.'s*** **hand** bir kəsin əlindən yapışmaq/tutmaq; **to ~ a rope** kəndirdən tutmaq/yapışmaq; *She grasped the post with her hands for fear of falling O, yıxılacağından qorxaraq əllərilə dirəkdən bərk-bərk tutdu; A man who grasps at too much may loose everything Çoxun dalınca qaçan azdan da olar;* **2.** dərhal anlamaq / başa düşmək / qavramaq; **to ~ an argument** dəlili dərhal anlamaq; *I can't grasp your meaning Mən sənin / sizin nə demək istədiyini / istədiyinizi anlaya bilmirəm;*

◊ **to ~ the nettle** çətin bir işə cəsarətlə girişmək; **to ~ the shadow and let go the substance** nağdı qoyub nisyənin dalınca düşmək; **to ~ at a straw** saman çöpündən yapışmaq; *Grasp all, lose all ≅ at. söz. Bir əldə iki qarpız tutmaq olmaz*

**grasper** [ˈgra:spəʳ] *n* pulagir, pulgir, rüşvətxor, öz mənafeyini güdən, mənfəətpərəst

**grasping** [ˈgra:spɪŋ] *adj* **1.** tez anlayan, başa düşən; **2.** xəsis, tamahkar, acgöz, gözüdoymaz

**grass**[1] [gra:s] *n* **1.** ot; **to cut the ~** otu biçmək; **2.** çim; **3.** *bot.* dənli bitkilər; **4.** *bot.* quşqonmaz, mərəçüyüd, qulançar *(bitki)*; **5.** çəmənlik, biçənək, otlaq; **6.** qazon, çəmənlik; *Come off the grass! Qazonu ayaqlama/ayaqlamayın!*; **to lay down in ~** *k.t.* otlaq/biçənək salmaq; **7.** otlaq, örüş; **8.** yer səthi; **at ~** yerin səthində/üstündə; **9.** *arx.* bahar, yaz; *She will be two years old next grass Gələn yaz onun iki yaşı olacaq;* **10.**: **~ shears** qazon/çəmən qayçısı;

◊ **between/betwixt ~ and hay** gənclik yaşında/çağında; *Come off the grass Əl çək lovğalanmaqdan! Qudurma! Yalan danışma!;* **to cut the ~ from under** ***smb.'s*** **feet** ayağının altını qazmaq; bir kəsin planlarını pozmaq; **to let no ~ grow under** ***one's*** **feet** cəld və qətiyyətlə iş görmək / hərəkət etmək; boş yerə vaxtını itirməmək; **to let the ~ grow under** ***one's*** **feet** əlini ağdan-qaraya vurmamaq, heç bir iş görməmək; boş yerə vaxt itirmək; **to be/to run at ~ 1)** istirahətdə/tətildə olmaq; 2) işsiz olmaq; **to put/to send/to turn out to ~ 1)** otlamağa buraxmaq; 2) işdən çıxarmaq/qovmaq; **to go to ~** əldən-ayaqdan/taqətdən/əldən düşmək; *Go to grass! Rədd ol!, Itil!, Cəhənnəm ol!*

**grass**[2] [gra:s] *v* **1.** ot əkmək; çim döşəmək; **2.** ot basmaq; *The old path was grassed over Köhnə yolu ot basdı;* **3.** otlamaq; **4.** otlağa aparmaq *(mal-qaranı)*; **5.** quş vurmaq *(güllə ilə)*

**grass-beef** [ˈgra:sbi:f] *n* yaz əti *(yazda kəsilmiş mal əti)*

**grass-blade** [ˈgra:sbleɪd] *n* ot saplağı, ot

**grass-butter** [ˈgra:sbʌtəʳ] *n* yazda tutulmuş yağ

**grass-cut** [ˈgra:skʌt] *n* muzdla otçalan adam

**grass-cutter** [ˈgra:s.kʌtəʳ] *n* **1.** = **grass-cut**; **2.** qazon qayçısı; **3.** otçalan maşın *(qazon üçün)*

**grass-cutting** [ˈgra:s.kʌtɪŋ] *n* *av. d.d.* alçaqdan uçuş *(təyyarə haq.)*

**grass-drake** [ˈgra:sdreɪk] *n* *zool.* çəkçəki *(quş)*

**grassed** [gra:st] *adj* ot basmış; **~ walk** ot basmış cığır

**grass-farm** [ˈgra:sfa:m] *n* otlaq/çəmən təsərrüfatı

**grass-flesh** [ˈgra:sfleʃ] *n* yaz-yay dövründə otla kökəldilmiş/bəslənmiş malın əti

**grass-green** [ˈgra:sˈgri:n] *adj* göy, ot rəngi

**grass-hook** [ˈgra:shuk] *n* oraq

**grass-hopper** [ˈgra:s.hɔpəʳ] *n* *zool.* **1.** şala cırcırama; **2.** çəyirtkə; **3.** cırcırama; **4.** *hərb. jarq.* yüngül rabitə təyyarəsi;

◊ **knee-high to a ~** dırnaq boyda, bir barmaq, bir qarış

**grass-land** [ˈgra:slænd] *n* otlaq, otlaq sahəsi

**grass-mower** [ˈgra:smouəʳ] *n* qazonçalan maşın

**grass-mowing machine** [ˈgra:s.mouɪŋ məˈʃi:n] *n* *k.t.* otçalan maşın

**grass-roots**[1] [ˈgra:sru:ts] *n* sadə adamlar, geniş xalq kütlələri, siyasətdən uzaq adamlar; *We must not neglect the grass-roots Biz geniş xalq kütlələrini nəzərdən qaçırmamalıyıq*

**grass-roots**[2] [ˈgra:sru:ts] *adj* kortəbii, qeyri-mütəşəkkil, qeyri-şüuri; **~ movement** kortəbii hərəkat

**grass-snake** [ˈgra:ssneɪk] *n* *zool.* koramal, suilanı

**grass-widow** [ˈgra:sˈwɪdou] *n* *müvəqqəti olaraq bir yerə gedib ərindən ayrı yaşayan qadın*

**grass-widower** [ˈgra:sˈwɪdouəʳ] *n* *müvəqqəti olaraq bir yerə gedib arvadından ayrı yaşayan kişi*

**grassy** [ˈgra:sɪ] *adj* **1.** otlu, ot basmış, sıx ot bitmiş; **2.** ot rəngi

**grate**[1] [greɪt] *n* **1.** şəbəkə; **2.** buxarı şəbəkəsi; **3.** buxarı; **old fashioned ~** qədimi buxarı; **4.** şadara, iri xəlbir, torpaq xəlbiri

**grate**[2] [greɪt] *v* I şəbəkəyə almaq, şəbəkə vurmaq; **to ~ a window** pəncərəyə şəbəkə vurmaq

**grate** [greɪt] *v* II **1.** sürtkəcdən/pendirtəraşdan keçirmək; **to ~ cheese** pendiri pendirtəraşdan keçirmək; *Will you grate cheese into beaten eggs, I am going to make cheese omelette Zəhmət olmasa, pendiri pendirtəraşdan keçirib çalınmış yumurtalara qat/qatın, mən pendir omleti bişirmək istəyirəm;* **2.** sürtmək; qıcırtmaq; **3.** cırıldamaq, qıcırdamaq, sürtmək; *The key grated in the lock Açar qıfılda cırıldadı; Wheels grate on an axle Oxda təkərlər cırıldayır;* **4.** *məc.* hirsləndirmək, əsəbiləşdirmək, qıcıqlandırmaq; *His voice grates on my ear Onun səsi mənim lap qulağımı deşir; His bad manners grated on everybody Onun pis ədaları hamını əsəbiləşdirdi*



**grateful** [ˈgreɪtfl] *adj* **1.** minnətdar, razılıq edən, qədirbilən, təşəkkür edən; **to be ~** minnətdar olmaq; *We are grateful to you for your help Köməyinə/Köməyinizə görə sənə/sizə minnətdarıq*; **~ letter** minnətdarlıq məktubu; **2.** bərəkətli *(torpaq haq.)*; **3.** xoşagedən, ləzzətli, səfalı, şirin; **~ shade** səfalı kölgə; **~ drink** ləzzətli içki; **~ sleep** şirin yuxu

**gratefully** [ˈgreɪtfəlɪ] *adv* **1.** minnətdarlıqla, razılıqla; **2.** ləzzətlə, xoş

**gratefulness** [ˈgreɪtfulnɪs] *n* minnətdarlıq, razılıq, təşəkkür

**grater** [ˈgreɪtəʳ] *n* sürtkəc, pendirtəraş, turptəraş

**gratification** [.grætɪfɪˈkeɪʃn] *n* **1.** məmnunluq, məmnuniyyət; *I have the gratification of knowing that I have done my duty Mən öz borcumu yerinə yetirdiyimi biləndə çox məmnun oluram*; **2.** mükafatlandırma; **3.** sədəqə, dilənçi payı

**gratify** [ˈgrætɪfaɪ] *v* **1.** təmin etmək, cavab vermək; **to ~** ***smb.'s*** **taste** bir kəsin zövqünə cavab vermək; **2.** kef vermək, məmnun etmək; sevindirmək; *We were all gratified with / at the results Nəticələr bizi məmnun etdi; It gratified me to learn that you had been successful Sənin/Sizin uğur qazanmağını/qazanmağınızı biləndə çox sevindim*; **3.** göz yummaq, yol vermək, özünü görməməzliyə vurmaq; imkan vermək, mane olmamaq *(pis adətə)*; **to ~ children's whims** uşaqların şıltaqlıqlarına göz yummaq; **4.** *arx.* mükafatlandırmaq, mükafat vermək; **5.** *arx.* rüşvət vermək

**grating**[1] [ˈgreɪtɪŋ] *n* **1.** şəbəkə, şəbəkəyə alma; **2.** şadaradan keçirmə, şadara ilə ələmə

**grating**[2] [ˈgreɪtɪŋ] *adj* **1.** cırıldayan; **2.** əsəbiləşdirən, qıcıqlandıran; **~ smile** qıcıqlandırıcı təbəssüm

**gratis** [ˈgreɪtɪs] *adv* havayı, pulsuz, müftə; **to admit ~ to a performance** tamaşaya pulsuz buraxmaq; *The children were admitted gratis to the performance Uşaqlar tamaşaya pulsuz buraxıldılar; Entrance is gratis Giriş sərbəstdir*

**gratitude** [ˈgrætɪtju:d] *n* təşəkkür, razılıq, minnətdarlıq; **as a token of ~** minnətdarlıq əlaməti olaraq; **to express** ***one's*** **~** öz minnətdarlığını izhar etmək/bildirmək

**gratuitous** [grəˈtju:ɪtəs] *adj* **1.** pulsuz, müftə, havayı, məccani; **~ help** məccani kömək; **~ teaching / training** pulsuz təhsil; **2.** könüllü; **3.** səbəbsiz, əsassız; **~ lie** əsassız yalan; **~ insult** səbəbsiz təhqir

**gratuity** [grəˈtju:ɪtɪ] *n* **1.** pul bəxşişi, maddi yardım; **to receive a small ~** az məbləğdə maddi yardım almaq; **2.** çaypulu, bəxşiş; **3.** rüşvət;

◊ **by way of ~** minnətdarlıq əlaməti olaraq

**grave**[1] [greɪv] *n* **1.** qəbir, məzar, gor; **to dig a ~** qəbir / gor qazımaq; **to sink into the ~** ölmək; **to sleep in the ~** əbədi yuxuya getmək; **2.** *məc.* ölüm; **untimely ~** vaxtsız ölüm; **to dread the ~** ölümdən qorxmaq; **3.** qəbirüstü daş, sinə daşı;

◊ **on this side of the ~** bu (işıqlı) dunyada; **to dig** ***one's*** **~** özü-özünə qəbir qazımaq; özü-özünü məhv etmək; **to dig** ***one's*** **~ with** ***one's*** **teeth** həddindən artıq yeməklə özünü məhv etmək; **to rise from the ~** xortlamaq, dirilmək; **to totter on the brink of the ~, to have one foot in the ~** bir ayağı gorda olmaq

**grave**[2] [greɪv] *adj* **(-r, -st) 1.** ciddi, tutarlı, mühüm; **~ responsibility** ciddi məsuliyyət; **~ errors** ciddi səhvlər; **to debate ~ matters** mühüm məsələləri müzakirə etmək; **2.** ağır, təhlükəli, gərgin; *The situation is more grave than it has been since the end of the war Indiki vəziyyət müharibə qurtardıqdan sonrakı vəziyyətdən daha ağırdır/təhlükəlidir;* **~ illness** ağır xəstəlik; **3.** qəmgin, kədərli, qüssəli, həzin, acı, pərişan; **~ news** acı xəbər; **4.** tünd, tutqun *(boya haq.)*; **5.** təmkinli, səbirli; **~ person** təmkinli/səbirli adam; *He looks grave Onun çox ciddi görkəmi var;* **6.** mötəbər, sözükeçən; **~ figure** mötəbər şəxs

**grave**[3] [greɪv] *v* I *(pt* **graved** [-d], *pp* **graved, graven)**; **1.** *arx.* oymaq, qazımaq, həkk etmək, naxış açmaq, yonmaq; *Time has graved deep furrows on his face Zaman onun üzündə dərin qırışlar həkk etmişdir;* **2.** dərin iz buraxmaq, *məc.* həkk olunmaq; **to ~ words in/on the heart** sözləri yaddaşına həkk etmək

**grave** [greɪv] *v* II *(pp* **graven** [greɪvn]) təmizləmək və qətranlamaq *(gəminin suya girən hissəsini)*

**grave-clothes** [ˈgreɪvklouðz] *n pl* **1.** dəfn libası *(xristianlarda)*; **2.** kəfən

**grave-digger** [ˈgreɪv.dɪgəʳ] *n* **1.** qəbirqazan, məzarçı; **2.** *zool.* qara böcək

**gravedo** [grəˈvi:dou] *n* *tib.* tumov, zökəm

**gravel**[1] [ˈgrævl] *n* **1.** çınqıl, iri qum, çınqıl daşı; **2.** tərkibində qızıl olan qum; **pay ~** sənaye əhəmiyyətli qızılı olan torpaq layı /mədəni; **3.** *tib.* sidik daşı/qumu; **4.** ballast

**gravel**[2] [ˈgrævl] *v* **(-ll-) 1.** çınqıl/qum tökmək/ döşəmək; **to ~ a path/a road/a walk** cığıra/yola/xiyabana çınqıl tökmək; **2.** *d.d.* çətin vəziyyətə salmaq, çaşdırmaq; *It will perhaps gravel even a philosopher Bu lap filosofu da çətin vəziyyətə sala bilər;* **3.** sözünü kəsmək, dayandırmaq; *He was gravelled for lack of time Vaxtın azlığından onun sözünü kəsdilər;* **4.** gəmini dayaz yerdə oturtmaq

**gravel-blind** [ˈgrævlblaɪnd] *adj* demək olar ki /təqribən kor

**graveling** [ˈgrævlɪŋ] *n* *zool.* cavan qızılbalıq

**gravelling** [ˈgrævlɪŋ] *n* çınqılla/qumla örtmə

**gravelly** [ˈgrævəlɪ] *adj* **1.** çınqıllı, qumsal; **~ soil** çınqıllı/qumsal torpaq; **2.** qum/çınqıl tökülmüş

**gravel-pit** ['grævlpɪt] *n* çınqıl karxanası

**gravel-stone** ['grævlstoun] *n* xırda çay daşı, çınqıl

**grave-mound** ['greɪvmaund] *n* kurqan, qəbirüstü təpə

**graven¹** ['greɪvn] **to grave** *felinin pp forması*

**graven²** ['greɪvn] *adj* həkk olunmuş; ~ **image** büt, sənəm; qibləgah

**graveness** ['greɪvnɪs] *n* ciddilik; **to put on** ~ ciddi görkəm almaq

**graver** ['greɪvəʳ] *n* **1.** həkkak, oyucu *(daş, ağac, sümük üzərində naxış qazıyan usta)*; **2.** həkkak / heykəltəraş qələmi

**grave-stone** ['greɪvstoun] *n* **1.** qəbirüstü daş, sinə daşı; **2.** qəbirüstü abidə, başdaşı

**graveyard** ['greɪvja:d] *n* qəbiristan, məzarlıq

**gravid** ['grævɪd] *adj* hamilə, boylu, ikicanlı, balalı; ~ **fish** kürülü balıq

**gravidity** [grə'vɪdɪtɪ] *n* hamiləlik, ikicanlılıq, boylu/balalı olma

**graving-dock** ['greɪvɪŋdɔk] *n* təmir doku *(gəmi təmir olunan yer)*

**gravitate** ['grævɪteɪt] *v* **1.** cəzb edilmək; cəzb etmək, can atmaq; *In summer people gravitate to the seaside Yayda camaat dənizə can atır;* **2.** (**towards**) çəkmək, çəkib gətirmək, çəkib yaxınlaşdırmaq; **3.** batırılmaq, salınmaq, soxulmaq *(mayeyə)*; çökmək, yatmaq *(suyun dibinə)*; **to** ~ **to the bottom** suyun dibinə çökmək/oturmaq

**gravitation** [,grævɪ'teɪʃn] *n* **1.** cazibə, cazibə qüvvəsi; **terrestrial** ~ yerin cazibə qüvvəsi; **the Law of** ~ cazibə qanunu; **to leave the radius of the earth's** ~ yerin cazibə qüvvəsi radiusundan çıxmaq; **2.** can atma, meyl; **strong** ~ **towards evil** yaramaz işlərə tərəf çox güclü meyl

**gravity** ['grævɪtɪ] *n* **1.** ciddilik, ciddiyyət; **the** ~ **of the political situation** siyasi vəziyyətin ciddiliyi; *The gravity of his offence cannot be disregarded Onun cinayətinin ciddiliyi nəzərə alınmaya bilməz;* **2.** ağırlıq, təhlükə, qorxu *(xəstəlik, vəziyyət və s. haq.)*; **3.** ciddiyyət, təmkin; **the** ~ **of** *smb.'s* **appearance** bir kəsin görkəminin ciddiliyi; *He could hardly keep his gravity O, təmkinini zorla saxlaya bildi;* **4.** cazibə qüvvəsi; **centre of** ~ ağırlıq mərkəzi

**gravy** ['greɪvɪ] *n* **1.** ət suyu *(əti pörtlədərkən çıxan)*; **2.** xörək şirəsi, sous; **excellent/overseasoned** ~ əla / çox duzlu /kəskin sous; **3.** asan qazanc, zəhmətsiz gəlir; **4.** rüşvət; **to dip in the** ~ dövlət pulunu mənimsəmək; **to ride the** ~ **train** sərfəli /gəlirli işə girmək/düzəlmək; *Get on the gravy train Elə işə gir/girin ki, orada asanlıqla pul qazanasan/qazanasınız;*

◊ *By gravy!, Good gravy! Əcəb işdir!, Lənət şeytana!, Ola bilməz!*

**gravy-boat** ['greɪvɪbout] *n* sous qabı

**gray** [greɪ] *adj* = **grey**

**grayling** ['greɪlɪŋ] *n zool.* xarius *(balıq növü)*

**graze¹** [greɪz] *n* **1.** toxunma, dəymə; **2.** sıyrıntı, yüngül yara

**graze²** [greɪz] *v* I **1.** yavaşca toxunmaq, ilişmək; *The bullet grazed the wall Güllə divarı bir az cızdı; The sun's rays grazed the summit of the mountain Günəşin şüaları dağın zirvəsinə azacıq toxunurdu;* **2.** sıyırmaq, sürtmək, sürtüb yara etmək, cızmaq, soymaq; **to** ~ ***one's*** **arm** əlini cızmaq; **to** ~ **the skin** dərisini soymaq

**graze** [greɪz] *v* II **1.** otarmaq; **to** ~ **cattle on the meadows** naxırı çəmənliklərdə otarmaq; **to** ~ **cattle all the winter** mal-qaranı bütün qışı otarmaq; **a field to** ~ **cattle** mal-qara örüşü; **2.** göy otla saxlamaq *(mal-qaranı)*; **3.** otlamaq; *The sheep are grazing upon the hills Qoyunlar dağlarda otlayır;* **4.** otlaq kimi istifadə etmək; **to** ~ **a field before haying it** biçməzdən əvvəl tarladan otlaq kimi istifadə etmək;

◊ **to send to** ~ qovmaq, bayıra atmaq

**grazer** ['greɪzəʳ] *n* **1.** otlayan heyvan; **2.** *pl* bəslənən heyvan

**grazier** ['greɪzɪəʳ] *n* maldar, heyvandar; maldarlıq/heyvandarlıq mütəxəssisi

**graziery** ['greɪzɪərɪ] *n* otlaqda bəslənmə *(mal-qara haq.)*; bəslənmə, kökəldilmə *(mal-qara haq.)*

**grease¹** [gri:s] *n* **1.** can yağı, piy, ərinmiş yağ/piy; **in prime/pride of** ~ yağlı, yağlanmış *(ov quşları haq.)*; **2.** sürtkü maddəsi, yağ; **axle** ~ çarx yağı; **3.** *d.d.* yaltaqlıq; rüşvət; **4.** *bayt.* keçoy *(atlarda ayaq xəstəliyi)*

**grease²** [grɪ:z] *v* **1.** yağlamaq, yağ sürtmək; **to keep a mechanism well ~d** mexanizmi səliqə ilə tam vaxtında yağlamaq; **2.** *məc.* "yağlamaq" *(rüşvət vermək mənasında)*; **to** ~ **the hand/the palm/the fist of** ***smb.*** bir kəsə rüşvət vermək, bir kəsin bığını yağlamaq;

◊ **to** ~ **the wheels** maneəsiz hərəkəti təmin etmək, yağ kimi getmək

**grease-box** ['grɪ:sbɔks] *n tex.* **1.** yağdan, yağ qabı; **2.** buksa *(vaqon təkəri oxunun hərləndiyi metal qutu)*

**grease-cup** ['grɪ:skʌp] *n tex.* **1.** = **grease-box; 2.** tavot qabı *(sürtkü yağları üçün)*

**grease-gun** ['grɪ:sgʌn] *n* qatı yağ şprisi

**grease-paint** ['grɪ:speɪnt] *n teatr.* qrim

**greaseproof** ['grɪ:spru:f] *adj* yağ buraxmayan, yağ keçirməyən

**greaser** ['grɪ:zəʳ] *n* **1.** yağlayan, yağlayıcı fəhlə; **2.** ocaqçı *(gəmidə)*; **3.** yağlayıcı alət/qurğu

**grease-remover** ['grɪ:srɪ'mu:vəʳ] *n* ləkətəmizləyən *(yağ ləkəsini)*

**greasily** ['grɪ:zɪlɪ] *adv* **1.** yağlı-yağlı; **2.** şit-şit, yaltaq-yaltaq

**greasiness** ['grɪ:zɪnɪs] *n* **1.** yağlılıq, köklük, piylilik; **2.** şitlik, yaltaqlıq

**greasy** ['grɪ:zɪ] *adj* **1.** yağlı, piyli; **to make** ***one's*** **clothes** ~ paltarını yağa batırmaq; *My hands are greasy Əllərim yağlıdır / yağa batıb;* ~ **food** yağlı yemək; **to taste** ~ piy dadı vermək /gəlmək; **2.** çirkli, palçıqlı, sürüşkən *(yol haq.)*; **3.** şit, yaltaq; **4.** yuyulmamış *(yun)*



**great¹** [greɪt] *n*: **the** ~ böyüklər; vacib/aparıcı şəxslər; *He is always talking about his connections with the great O həmişə böyük adamlarla əlaqələrindən danışır*

**great²** [greɪt] *adj* **1.** böyük, nəhəng, çox iri, zorba, azman, əzəmətli; ~ **city** böyük şəhər; ~ **building** əzəmətli bina; ~ **sum of money** böyük məbləğdə / külli miqdarda pul; **2.**: *anat.* ~ **gut** yoğun bağırsaq; ~ **toe** baş barmaq *(ayaqda)*; ~ **patience** böyük səbir; **with** ~ **pleasure** böyük məmnuniyyətlə; *The greater part of the work was done by him Işin böyük bir hissəsini o gördü;* **3.** uzun, böyük; **a** ~ **way** uzun yol; **a** ~ **distance** böyük məsafə; **a** ~ **while** uzun müddət; **a** ~ **while ago** lap çoxdan; ~ **age** ahıl yaş; **4.** dərin, böyük, çox; ~ **love** dərin məhəbbət; ~ **friendship** böyük dostluq; ~ **ignorance** qara cahillik, çox ədəbsizlik; **5.** güclü, şiddətli, gur; ~ **fire** güclü yanğın; ~ **light** güclü /gur işıq; ~ **pain** şiddətli ağrı; ~ **wind** güclü külək; **a** ~ **deal, a** ~ **many, a** ~ **number** külli miqdarda, böyük məbləğdə; **with a** ~ **deal of trouble** böyük üzüntülərlə; *A great many people were there Orada həddindən çox adam var idi;* **6.** böyük, dahi; **a** ~ **painter/ writer/composer** dahi rəssam/yazıçı/bəstəkar; **the Great Charter** Böyük Hürriyyət Xartiyası; **the Great War** Birinci Dünya müharibəsi; **the Great Powers** böyük dövlətlər; **7.** böyük, əsl, həqiqi; **a** ~ **friend of mine** mənim həqiqi/əsl dostum; **Great Britain** Böyük Britaniya; **8.** əsil, əsilzadə; ~ **lady** əsilzadə xanım, kübar ailəsindən olan qadın; ~ **families** kübar ailələri; **the** ~ **world** kübar cəmiyyəti, kübar dairələri/dünyası; **9.** əla, gözəl; **to have a** ~ **time** vaxtını gözəl keçirmək; *We had a great time in Paris. Wouldn't it be great if we could go there again? Biz Parisdə gözəl vaxt keçirdik. Ora bir də gedə bilsəydik, əla olmazdımı?; That's great! Əla!, Çox gözəl!;* **10.** *Başqa bir sifətdən əvvəl işlənib təəccüb, hiddət, qəzəb və s. bildirir;* **a** ~ **big man** çox böyük adam; **a** ~ **fat boy** çox kök oğlan; *See what a great big fish I've caught Bax, nə boyda balıq tutmuşam;* **11.** (**at, in**) mahir, təcrübəli, güclü, səriştəli; **to be** ~ **at golf** qolf oynamaqda mahir olmaq; **a nation** ~ **in arms** hərbi cəhətdən güclü ölkə;

◊ ~ **chair** kreslo; ~ **cats** şirlər, pələnglər, bəbirlər; ~ **dozen** on üç; ~ **hundred** yüz iyirmi; *Great God!, Great Lord! Aman Allah!, Allah sən özün kömək ol!, Allah özü görür!; Great Scott!, Great guns!, Lənətə gələsən!, Lənət sənə!; No Great shakes Dünya zad dağılmadı ki?!*

**great-aunt** ['greɪt'a:nt] *n* nənənin/babanın bacısı

**great-bilberry** ['greɪt'bɪlbərɪ] *n bot.* cır mərsin

**greatcoat** ['greɪt'kout] *n* palto *(kişi üçün)*; şinel

**great go** ['greɪt'gou] *n* son imtahan *(Kembric və Oksford universitetlərində bakalavr dərəcəsi almaq üçün)*

**great-grandchild** ['greɪt'græntʃaɪld] *n (pl* **-children** [-tʃɪldrən]) nəticə

**great-granddaughter** ['greɪt'græn.dɔ:təʳ] *n* qız nəticə

**great-grandfather** ['greɪt'græn'fa:ðəʳ] *n* ulu baba, cəddü-əqrəba

**great-grandma(mma)** ['greɪt'grænma:,-mə.ma:] *n* böyük nənə

**great-grandmother** ['greɪt'græn.mʌðəʳ] *n* böyük nənə

**great-great-grandfather** ['greɪt'greɪt'græn .fa:ðəʳ] *n* ulu babanın babası

**great-grouse** ['greɪtgraus] *n zool.* Sibir xoruzu

**great-hearted** ['greɪt'ha:tɪd] *adj* mərd, comərd, alicənab, geniş/böyük ürəkli

**greatly** ['greɪtlɪ] *adv* **1.** çox, artıq, olduqca, son dərəcədə, xeyli; **to contribute** ~ **to** ***smth.*** bir şeyə çox böyük yardım / kömək etmək; **to be** ~ **surprised** çox təəccüblənmək; *He was greatly surprised O çox təəccübləndi;* **to be** ~ **altered** çox dəyişmək; *He was greatly amused by my answer Mənim cavabım onu çox xoşhal etdi / sevindirdi; I am greatly obliged to you Mən sənə / sizə çox borcluyam;* **2.** mərdcəsinə, mərdliklə, alicənabcasına, fədakarcasına

**greatness** ['greɪtnɪs] *n* **1.** böyüklük; **2.** əzəmət, calal; **3.** qüvvə, güc, zor; **4.** alicənablıq, nəciblik, mərdlik

**greaves** [gri:vz] *n* I *pl* dəmir geyim, zireh *(yaraq-əslahənin baldıra geyilən hissəsi)*

**greaves** [gri:vz] *n* II *pl* cızdaq *(əridilmiş piyin/quyruğun qalığı)*

**grebe** [gri:b] *n zool.* anqut *(quş)*

**Grecian¹** ['gri:ʃən] *n* ellinist *(qədim yunan dili və ədəbiyyatı mütəxəssisi)*

**Grecian²** ['gri:ʃən] *adj* yunan *(üslub haq.)*; ~ **architecture** yunan arxitekturası/memarlığı

**greed** [gri:d] *n* tamahkarlıq, acgözlük, xəsislik, hərislik; ~ **for/of money** pula hərislik; *He is not hungry, it is sheer greed that makes him eat so much O, ac deyil, sadəcə acgözlükdən bu qədər yeyir*

**greedily** ['gri:dɪlɪ] *adv* **1.** tamahkarcasına, acgözlüklə, hərisliklə, xəsisliklə; *He was greedily looking at the cakes O acgözlüklə kökələrə baxırdı;* **2.** böyük maraqla/həvəslə; **to read** ~ böyük həvəslə oxumaq

**greediness** ['gri:dɪnɪs] *n* **1.** tamahkarlıq, acgözlük, xəsislik, hərislik; **2.** qarınquluLuq; **3.** həvəs, cəhd, səy, şövq

**greedy** ['gri:dɪ] *adj* **1.** tamahkar, xəsis, həris, acgöz; ~ **for/of gold** qızıla hərislik; **with** ~ **eyes** həris nəzərlə; *He was looking at the cakes with greedy eyes O, kökələrə həris nəzərlərlə baxır-*

*dı;* **to cast ~ eyes upon** ***smth.*** bir şeyə həris nəzər yetirmək / salmaq; **2.** qarınqulu; **~ for / of sweets** şirniyyatdan doymayan, şirnisevən; *He is a greedy eater O, qarınquludur; He is not hungry, he is just greedy O, ac deyil, sadəcə qarınquludur;* **3.** ehtirasla arzu edən/həsrət çəkən, həsrətində olan, susamış; **~ for/of fame** şöhrətpərəst, şöhrət hərisi/düşkünü; **~ for praise** tərifsevən, tərif düşkünü / hərisi

**Greek¹** [gri:k] *n* **1.** yunan; **2.** yunan dili; **the ~s** yunanlar;

◊ **gay/merry/mad ~ 1.** şən/zarafatcıl / kefcil / məzəli adam; **2.** həmpiyalə, içki / kef yoldaşı; *It is Greek to me Mən belə şeyləri anlamıram, Bu mənim üçün qətiyyən aydın deyil; When Greek meets Greek (then comes the tug of war) ≅ at. söz. İki qoçun başı bir qazanda qaynamaz*

**Greek²** [gri:k] *adj* yunan; **~ architecture** yunan memarlığı / arxitekturası

**green¹** [gri:n] *n* **1.** yaşıl rəng; **a girl dressed in ~** yaşıl geyimli qız; yaşıl geyimdə olan qız; **2.** yaşıl boya; **3.** bitki, nəbatat; **4.** *pl* göy, göy-göyərti, tərəvəz; **5.** *məc.* gənclik, güc; **in the ~** həyatın çiçəklənmə dövründə/zamanında; *They are still in the green Onlar hələ gəncdirlər;* **6.** göylük, çəmənlik, biçənək, otluq; **7.** yaşıl meydança *(qolf oyunu üçün)*;

◊ *Do you see /Is there any green in my eye? Məgər mən sənə belə sadəlövh görünürəm?*

**green²** [gri:n] *adj* **1.** yaşıl; **~ dress** yaşıl paltar/geyim; **~ light** svetoforun yaşıl işığı; **to give** ***smb.*** **the ~ light** bir kəsə "yaşıl işıq" yandırmaq, bir kəsə istədiyini etməyə izn/səlahiyyət vermək; **2.** solğun, rəngi solmuş/qaçmış, ağarmış *(bəniz haq.)*; **to grow/to go/to turn ~** göyərmək, gömgöy olmaq; **~ with envy / jealousy** paxıllıqdan/qısqanclıqdan gömgöy olmuş; **3.** yaşıl, göy, dəyməmiş, kal; **~ apple** kal /dəyməmiş alma; **4.** təzə, tər; **~ vegetable** təzə/ tər tərəvəz; **5.** yaş, təzə kəsilmiş; *Green wood does not burn well Yaş odun/ağac yaxşı yanmır;* **~wood** yaş /nəm/təzə kəsilmiş taxta /taxta-şalban; **~ brick** çiy kərpic; **6.** sağalmamış, təzə; **~ wound** təzə yara; **7.** gümrah, çiçəklənən; **~ old age** gümrah qocalıq; **8.** gənc; **the ~ years** gənclik illəri; **9.** təcrübəsiz, naşı, cavan; *The boy is still green at his job Oğlan öz işində hələ naşıdır;* **a ~ hand** naşı /təcrübəsiz /gənc işçi; **10.** sadəlövh; *I'm not so green as to believe that Mən o qədər də sadəlövh deyiləm ki, elə şeylərə inanım, Mən elə şeylərə inanası qədər də sadəlövh deyiləm;*

◊ **a ~ Christmas** qarsız, mülayim havalı Mövlud bayramı; **~ winter** qarsız/quraq/mülayim qış; **~ finger/thumb** bağçılıq mədəniyyəti; *He has green fingers O nə əkirsə, hamısı bitir / göyərir*

**green³** [gri:n] *v* **1.** yaşıllaşmaq; **2.** yaşıl rəngdə boyamaq/rənglənmək; **3.** *d.d.* aldatmaq, başını aldatmaq

**greenback** [ˈgri:nbæk] *n* **1.** *d.d.* banknot; **2.** kağız pul; **3.** *zool.* cüllüt fəsiləsi

**greenblind** [ˈgri:nˈblaɪnd] *adj* yaşıl rəngi seçməyən/fərqləndirməyən

**greenblindness** [ˈgri:nˈblaɪndnɪs] *n* yaşıl rəng korluğu, deyteranopiya

**green broom** [ˈgri:nbru:m] *n bot.* nəfəsotu

**green cheese** [ˈgri:ntʃi:z] *n* **1.** təzə pendir; **2.** üzsüz pendir

**greencloth** [ˈgri:nklɔθ] *n* **1.** yaşıl mahud *(bilyard stolunda)*; **2.** qumar masası/stolu

**green-crop** [ˈgri:nˈkrɔp] *n k.t.* yaşıl yem

**greener** [ˈgri:nəʳ] *n* **1.** təzə/təcrübəsiz/xam/ naşı işçi; **2.** təzə gəlmiş mühacir; **3.** sadəlövh adam

**greenery** [ˈgri:nəri] *n* bitki, nəbatat, yaşıllıq, göylük

**green-eyed** [ˈgri:naɪd] *adj* **1.** qısqanc; **2.** paxıl;

◊ **~ monster** qısqanclıq; paxıllıq

**greenfinch** [ˈgri:nfɪntʃ] *n zool.* yaşılca *(quş)*

**greengage** [ˈgri:ngeɪdʒ] *n* gavalı *(macar gavalısı)*

**green goods** [ˈgri:ngudz] *n* **1.** tər/təzə tərəvəz; **2.** *amer.jarq.* saxta kağız pul

**greengrocer** [ˈgri:n.grousəʳ] *n* göyərtisatan, tərəvəzsatan, səbzəvatçı; meyvə mağazası satıcısı

**greengrocery** [ˈgri:n.grousəri] *n* **1.** göy-göyərti / meyvə köşkü; **2.** göyərti, meyvələr

**greenhorn** [ˈgri:nhɔ:n] *n* **1.** xam/naşı adam; **2.** *məc.* südəmər uşaq

**greenhouse** [ˈgri:nhaus] *n* istixana, oranjereya, parnik

**greening** [ˈgri:nɪŋ] *n* göy alma *(alma növü)*

**greenish** [ˈgri:nɪʃ] *adj* yaşılımtıl, yaşıltəhər

**green-louse** [ˈgri:nlaus] *n (pl* **-lice** [-laɪs]) yarpaq mənənəsi *(bitki biti)*

**greenness** [ˈgri:nnɪs] *n* **1.** yaşıl, yaşıllıq *(rəng haq.)*; **the ~ of grass** otun yaşıllığı *(yaşıllıq dərəcəsi)*; **2.** kallıq; yetişməmə, kamala çatmama, təcrübəsizlik; **the ~ of the troops** ordunun təcrübəsizliyi; **3.** gümrahlıq, qıvraqlıq; təzəlik

**green-onion** [ˈgri:nˈʌnjən] *n bot.* göy soğan

**green-pea** [ˈgri:npi:] *n bot.* göy noxud

**green-peak** [ˈgri:npi:k] *n zool.* ağacdələn *(quş)*

**green-room** [ˈgri:nrum] *n* **1.** aktyorlar foyesi *(fasilədə aktyorların istirahəti üçün yer)*; **2.** teatr dedi-qoduları/qeybətləri/xəbərçiliyi; **3.** anbar *(fabrikdə hazır məhsulu saxlamaq üçün)*

**green-salting** [ˈgri:n.sɔ:ltɪŋ] *n* göy halda duza qoyma *(pomidoru və s.)*

**green scum**[ˈgri:nskʌm] *n* gəz bağlama, yosunla örtülmə *(durğun su haq.)*

**greensickness** [ˈgri:n.sɪknɪs] *n tib.* xloroz, anemiya, qansızlıq, hipoxrom anemiya

**greenstone** [ˈgri:nstoun] *n miner.* **1.** porfir *(tikintidə istifadə olunan vulkanik süxur)*; **2.** nefrit *(ağ/süd rəngli və ya yaşıla çalan bərk mineral)*



**green-stuff** [ˈgri:nstʌf] *n* tər tərəvəz; tər göyərti /göy

**greensward** [ˈgri:nswɔ:d] *n* çim; torf

**greenware** [ˈgri:nwɛəʳ] *n* çiy/yandırılmamış saxsı şeylər, çiy keramika

**Greenwich** [ˈgri:nɪdʒ, -tʃ] *n* Qrinviç *(Londonun ətrafı)*; **~ mean time** *(ixtis. GMT)* Qrinviç vaxtı

**greenwood** [ˈgri:nwud] *n* yaşıl meşə;

◊ **to go to the ~ 1)** quldur / yolkəsən / soyğunçu olmaq; quldurluq etmək; **2)** qanun xaricində elan olunmaq

**greeny** [ˈgri:nɪ] *adj* = **greenish**

**greenyard** [ˈgri:nja:d] *n* **1.** naxırdan geri qalan mal-qara üçün ağıl; **2.** ov itləri üçün təlim meydanı

**greet** [gri:t] *v* **1.** salamlaşmaq; salam vermək /salamlamaq *(başı ilə, papağını götürməklə və s.)*; **to ~** ***smb.*** **with a smile** bir kəsi təbəssümlə salamlamaq; **to ~ the rising sun** doğan günəşi salamlamaq; **2.** qarşılamaq *(alqış sədaları ilə, alqışlarla, səs-küylə, atəşlə və s.)*; **to ~ with applause** alqışlarla qarşılamaq; *The news was greeted with dismay Bu xəbər təşvişlə/ həyəcanla qarşılandı; They greeted me with a shower of stones Onlar məni daşqalaqla qarşıladılar;* **3.** çatmaq, yayılmaq, gəlmək *(səs, iy və s.)* duyulmaq; *The aroma of coffee greeted us Biz kofenin ətrini duyduq;* **4.** ruhunu oxşamaq, könlünü açmaq; *Music greets the ear Musiqi qulağı oxşayır;* **5.** görünmək, açılmaq; *A magnificent view of the sea greeted us Gözlərimiz önündə gözəl bir dəniz mənzərəsi açıldı*

**greeting** [ˈgri:tɪŋ] *n* **1.** salamlama; **friendly ~** dostcasına salamlama; *Greetings to all Hamıya salamlar;* **to answer** ***smb.'s*** **~s** bir kəsin salamını almaq/salamına cavab vermək; **2.** salam, təzim; **kindest ~s from afar** uzaqdan səmimi salamlar; **to send** ***smb.*** **one's best ~s** bir kəsə atəşin salam göndərmək; **3.** alqışlarla qarşılama; səmimi qəbul; **cordial ~** səmimi görüş / qəbul

**greeting-card** [ˈgri:tɪŋka:d] *n* təbrik kartı

**gregarious** [greˈgeərɪəs] *adj* **1.** sürü/toplu halında yaşayan, dəstə ilə yaşayan; *These animals are gregarious Bu heyvanlar sürü halında yaşayırlar;* **2.** ünsiyyətli, mehriban, adama yovuşan

**Gregorian** [greˈgɔ:rɪən] *adj* qreqorian; **~ Calendar** qreqorian kalendarı/təqvimi; yeni kalendar/təqvim; **~ style** yeni üslub; **~ chants** qreqorian kilsə musiqisi

**gremlin** [ˈgremlɪn] *n* **1.** *av. d.d.* şər cin *(təyyarəçiyə uğursuzluq gətirən şər qüvvə)*; **2.** müəmmalı şər qüvvə

**grenade** [grɪˈneɪd] *n* **1.** qumbara, əl bombası; **2.** içi yanğınsöndürən qarışıqla dolu şüşə qab; **3.** qumbaraatan *(silah)*

**grenade-gun** [grɪˈneɪdgʌn] *n* = **grenade** *(3-cü mənada)*

**grenadier** [.grenəˈdɪəʳ] *n* qrenader *(seçmə əsgər)*

**grenadine** [.grenəˈdɪ:n] *n bot.* bağ qərənfili

**grew** [gru:] **to grow** *felinin pt forması*

**grey¹** [greɪ] *n* **1.** boz rəng; **2.** boz rəngli boya; **3.** boz rəngli parça/material; **to dress in ~** boz paltar geymək; **4.** boz at; **5.** çal/ dən düşmüş saç; **the ~ in/of his hair** onun çallaşmış/ağarmış saçları; *His hair is touched with grey Onun saçına dən düşüb/saçı ağarıb;* **6.** alaqaranlıq, toran; **the ~ of the dawn** sübhün alaqaranlığı

**grey²** [greɪ] *adj* **1.** boz; kül rəngi almış; **~ horse** boz at; **to turn/to become ~** solmaq, bozarmaq; *His face looked grey Onun sifəti yorğun görünürdü;* **2.** çal, ağarmış, dən düşmüş; **~ hair** ağ tük/saç; **~ hairs** çal / ağarmış saç; **to turn / to become ~** saçı ağarmaq, saçlarına dən düşmək; *His hair has turned grey Onun saçlarına dən düşüb; He grew grey in the service O işləyə-işləyə/işdə qocaldı;* **3.** tutqun, buludlu; **a ~ day** tutqun / buludlu gün; **4.** qəmgin, kədərli; **~ thoughts** kədərli düşüncələr; **~ life** qəmgin həyat; *The future looked grey to him Gələcək ona dumanlı görünürdü;*

◊ **~ market** şeytanbazar, alver meydanı; *The grey mare is the better horse ≅ at. söz. Arvad evin dirəyidir*

**grey³** [greɪ] *v* **1.** boz rəngə salmaq; **2.** bozarmaq, solmaq; **3.** çallaşmaq, saçı ağarmaq

**greybeard** [ˈgreɪbɪəd] *n* **1.** ağsaqqal, qoca kişi, ixtiyar; **2.** saxsı şərab bardağı

**greycing** [ˈgreɪsɪŋ] *n* **(greyhound racing**-*in ixtisarı)* tazılarla mexaniki dovşan ovu *(idman növü)*

**grey-coat** [ˈgreɪkout] *n* boz şinelli əsgər

**grey-eyed** [ˈgreɪaɪd] *adj* alagöz

**grey-friar** [ˈgreɪˈfraɪəʳ] *n* fransiskan *(katolik təriqət rahibi)*

**grey-goose** [ˈgreɪgu:s] *n* çölqazı *(quş)*

**grey-haired** [ˈgreɪˈheəd] *adj* saçı ağarmış, çal, ağ saçlı

**grey-headed** [ˈgreɪˈhedɪd] *adj* başı ağarmış, qoca

**grey-hen** [ˈgreɪhen] *n* tetra quşu

**grey-hound** [ˈgreɪhaund] *n* **1.** tazı, ov iti; **2.** sürətli okean gəmisi; **3.** uzaq səfər avtobusu

**greyish** [ˈgreɪɪʃ] *adj* **1.** bozumtul; **2.** bir qədər çallaşmış, çaltəhər, bozumtul ağ

**greylag** [ˈgreɪlæg] *n* = **grey goose**

**greyly** [ˈgreɪlɪ] *adv* tutqun; qaşqabaqlı, narazı bir surətdə; *Dawn rose greyly Dan yeri tutqun halda söküldü*

**grey-matter** [ˈgreɪˈmætəʳ] *n* **1.** beynin boz maddəsi; **2.** *d.d.* ağıl, beyin; **a boy without much ~** çox ağıllı olmayan oğlan

**griddle¹** [ˈgrɪdl] *n* **1.** dəstəkli tava; **2.** irigözlü ələk, şadara *(filizi arıtmaq üçün)*

**griddle²** [ˈgrɪdl] *v* **1.** tavada qovurmaq/qızartmaq; **2.: to ~ out** filiz ələmək

**griddle-cake** [ˈgrɪdlkeɪk] *n* oladya, lepyoşka *(buğda unundan tavada bişirilən kökə)*

**gride¹** [graɪd] *n* cırıltı, qıcırtı, xışıltı, vızıltı
**gride²** [graɪd] *v* **1.** vızıltı ilə girmək/sancılmaq *(həm də* **to ~ along/through**); **2.** deşmək, dəlmək, sancılmaq, dəlib deşmək
**gridiron¹** ['grɪd.aɪən] *n* **1.** odluq qəfəsəsi, qəfəsə/raşper *(üstündə közdə ət qızartmaq üçün cihaz)*; **2.** şəbəkə, tor, setka; **3.** ehtiyat hissələri və təmir alətləri dəsti; **4.** tərtibat stansiyası *(dəmiryol qatarlarının tərtib olunduğu və açıldığı stansiya)*; **5.** *teatr.* dekorasiya asılan tirlər; **6.** *amer. d.d.* futbol meydançası;
◊ **to be on the ~** tikan / iynə üstündə oturmaq, çox narahat olmaq
**gridiron²** ['grɪd.aɪən] *v* xəritədə dəmiryol xətləri şəbəkəsini göstərmək
**grief** [gri:f] *n* **1.** dərd, qəm, qüssə, kədər; **great ~** böyük dərd; **secret ~** gizli qüssə/ qəm; **to be driven mad by ~** qəm-qüssədən dəli olmaq; **to die of ~** dərddən ölmək; *Grief consumed him Kədər onun içini yeyirdi;* **2.** ürək acısı, məyusluq, pərtlik, dilxorluq; *His taking to drugs was a great grief to his parents Onun narkotik maddələrə qurşanması valideynləri üçün dilxorçuluq idi;* **to be a ~ to smb.** bir kəsi kədərləndirmək/məyus etmək, bir kəs üçün dərd olmaq;
◊ **to come to ~** zavala gəlmək, bəlaya düşmək; *Drive slower or you will come to grief Bir az yavaş sür/sürün, yoxsa xataya/bəlaya düşərsən/düşərsiniz;* **to bring to ~** bədbəxtliyə gətirib çıxartmaq, axırı bədbəxtliklə nəticələnmək
**griefless** ['gri:flɪs] *adj* qəm-qüssədən xəbərsiz, qəmsiz, kədərsiz
**grief-stricken** ['gri:f'strɪkən] *adj* dərd basmış, dərddən / nisgildən üzülmüş
**grievance** ['gri:vəns] *n* şikayət, narazılıq, inciklik; *The trade union leader spoke about the grievances of the workers Həmkarlar İttifaqı lideri fəhlələrin narazılıqları haqqında danışdı;* **people with a ~** daima narazı adamlar; **to vent/to state/ to air one's ~s** şikayətlənmək, haqsızlıqdan danışmaq; *What is your grievance? Şikayətin/Şikayətiniz nədir?, Nədən narazısan?/narazısınız?; Don't hold it as a grievance against me Buna görə məndən incimə/inciməyin, Buna görə mənə acığın/acığınız tutmasın;* **to redress a ~** inciklíyi yumşaltmaq, umu-küsünü aradan götürmək; **~ committee** münaqişə komissiyası *(istehsalatda)*
**grieve** [gri:v] *v* **1.** kədərləndirmək, qüssələndirmək, qəm-qüssə gətirmək/vermək; ovqatını təlx etmək, məyus etmək; **to ~ smb. to the heart** bir kəsi son dərəcə/çox kədərləndirmək; *His mother's death grieved him to the heart Anasının ölümü onu çox kədərləndirdi; His conduct grieves me Onun davranışı məni məyus edir;* **2.** dərd/qəm çəkmək, kədərlənmək, sızlamaq; ah-nalə etmək/çəkmək, ağlayıb-sıtqamaq, ağlayıb-sızlamaq; *We are grieved over his death Onun ölümü bizi dərindən kədərləndirir;* **to ~ at/for/over smb./smth.** bir kəs/şey üçün ağlayıb-sızlamaq/ağlayıb-sıtqamaq; *Don't grieve! Qəm yemə!*
**grievous** ['gri:vəs] *adj* **1.** qəmli, kədərli, dərdli, iztirablı; **~ farewell** qəmli-kədərli vida / ayrılıq; **~ incident** təəssüf ediləcək hadisə; **2.** ağır, dəhşətli; **~ crime** ağır cinayət; **~ sin** dəhşətli günah; **~ wrong** dəhşətli/ağlasığmaz ədalətsizlik; **3.** üzücü, şiddətli; **~ pain** şiddətli ağrı; **~ wound** qorxulu/ağır yara; **~ cry** dərdli haray
**grievously** ['gri:vəslɪ] *adv* kədərli-kədərli, dərdli-dərdli, qəmli-qəmli, acı-acı, dəhşətli surətdə, qəmgin-qəmgin
**griff** [grɪf] *n* = **griffin** II
**griffin** ['grɪfɪn] *n* I **1.** *əs.* qrifon *(antik əfsanələrdə qartal başlı, aslan bədənli, qanadlı əjdaha)*; **2.** sayıq keşikçi; **3.** *zool.* keçəl kərkəs
**griffin** ['grɪfɪn] *n* II **1.** Hindistana yenicə gəlmiş avropalı; **2.** xam, naşı adam
**griffon** ['grɪfən] *n* qrifon *(uzun tüklü ov iti)*
**grill¹** [grɪl] *n* **1.** = **gridiron¹**; **2.** odluq qəfəsi üstündə közdə qızardılmış ət və ya balıq; **mixed ~** assorti *(qızarmış ətdən, qaraciyərdən məxsusən seçilib düzəldilmiş yemək)*; **3.** = **grill-room**;
◊ **to put on the ~** işgəncə verməklə istintaq aparmaq
**grill²** [grɪl] *v* **1.** odluq qəfəsin üstündə qızartmaq; **2.** yandırmaq, oda vermək, qarsalatmaq, ütmək; **3.** yanmaq, bişmək; **to lie ~ing in the sunshine** günün altında yanmaq/bişmək; **4.** işgəncə verməklə istintaq aparmaq
**grillage** ['grɪlɪdʒ] *n* şəbəkə
**grille** [grɪl] *n* **1.** şəbəkə *(təhlükəsizlik məqsədilə istifadə olunan)*; **2.** dekorativ metal şəbəkə; **3.** poçt haqqının marka ilə ödənildiyini təsdiqləmək üçün istifadə olunan möhür
**grill-room** ['grɪlrum] *n* müştərinin sifarişi ilə közdə qızardılmış ət və ya balıq verilən restoran
**grilse** [grɪls] *n* cavan qızılbalıq
**grim** [grɪm] *adj* **1.** rəhmsiz, qəddar, insafsız, zalım, daşürəkli, amansız; **~ struggle** amansız mübarizə; **2.** sərt, qəti, möhkəm, dəyişməz; **~ countenance** sərt sifət, sərt görünüş; **to keep a ~ silence** səsini/cınqırını çıxarmamaq; **~ determination** qəti qərar; **~ truth** acı həqiqət; **3.** pis, xoşagəlməz, iyrənc, acı; **a ~ task** xoşagəlməz tapşırıq;
◊ **to hold on / to cling like ~ death** bərk-bərk yapışmaq
**grimace¹** [grɪ'meɪs] *n* **1.** ağız-burnunu əymə, üz-gözünü büzüşdürmə/turşutma; əzilib-büzüşmə; **2.** mimika; **to make/to pull ~s** üz-gözünü büzüşdürmək, oyun çıxarmaq
**grimace²** [grɪ'meɪs] *v* ağız-burnunu əymək, üz-gözünü büzüşdürmək; özünü əzib büzmək, özünü əzmək



**grimalkin** [grɪ'mælkɪn] *n* **1.** qocalmış pişik; **2.** *isteh.* acıqlı, deyingən qarı; küpəgirən qarı
**grime¹** [graɪm] *n* bir şeyin üzərinə oturmuş/çökmüş çirk təbəqəsi/qatı; his, qurum, kömür tozu; **the ~ of a manufacturing town** sənaye şəhərinin çirki / hisi; *His face was covered with grime and sweat Onun sifəti çirk və tərlə örtülmüşdü*
**grime²** [graɪm] *v* çirkləmək, kirlətmək, bulamaq, batırmaq, ləkələmək; *His face was grimed with dust Onun sifətini toz basmışdı*
**grimly** ['grɪmlɪ] *adv* **1.** qəddarcasına, amansızcasına, zalımlıqla, rəhm etmədən; **to fight ~** amansızcasına döyüşmək/mübarizə aparmaq; **2.** qətiyyətlə, cəsarətlə; qəti surətdə; **to be ~ determined** qəti qərara gəlmək; qətiyyətli /əzmkar olmaq
**grimy** ['graɪmɪ] *adj* his basmış, çirkli, kirli, hisli-paslı, çirk-pasaq basmış; **~ hands** hisdən qapqara olmuş əllər; **~ buildings** hisli binalar
**grin¹** [grɪn] *n* diş ağartma, irişmə, istehzalı təbəssüm; **to break into / to give a ~** qımışmaq /gülümsəmək; *There was a foolish grin on his face Onun sifətində səfeh bir təbəssüm vardı*
**grin²** [grɪn] *v* **1.** gülümsəmək, hırıldamaq, dişini ağartmaq; **to ~ with delight** sevincdən gülümsəmək; **to ~ from ear to ear** ağzı qulağına çatana qədər gülmək; **to ~ approval** təbəssümlə təqdir etmək; *He grinned his approval O gülümsəməklə bəyəndiyini bildirdi;* **to ~ delight** gülüşlə öz sevincini ifadə etmək; **2.** dişlərini qıcırdatmaq; **to ~ like a dog** it kimi dişlərini qıcırdatmaq;
◊ **to ~ and bear it** əzab-əziyyətə mətanətlə dözmək, gülərək öz əzab-əziyyətini büruzə verməmək; **to ~ like a Cheshire cat** ağzı qulağına çatana qədər gülmək, qəşş etmək
**grind¹** [graɪnd] *n* **1.** üyütmə; **2.** ağır, yeknəsəq iş; *This work is a considerable grind Bu iş kifayət qədər yeknəsəqdir; Do you find this work a grind? Sən / Siz bu işi ağır və yeknəsəq hesab edirsən?/ edirsiniz?;* **3.** *d.d.* əzbərləmə, tutuquşuvari öyrənmə *(mənasını anlamadan)*; *Learning this text is a grind Belə mətni əzbərləmək lazım gəlir;* **4.** *d.d.* manеələri dəf etməklə at yarışı
**grind²** [graɪnd] *v (pt, pp* **ground** [graund]) **1.** üyütmək, əzmək, çəkmək, döymək; **to ~ flour** un üyütmək; **to ~ wheat in a mill** dəyirmanda buğda üyütmək; **to ~ into dust/to powder** üyüdüb toz halına salmaq; **to ~ smth. with one's heel** bir şeyi dabanı ilə əzmək; **2.** üyünmək, döyülmək; *This wheat grinds well Bu buğda yaxşı üyünür; This wheat will not grind fine Bu buğda narın üyünməyəcək;* **3.** cilalamaq, pardaxlamaq, hamarlamaq; **to ~ dry/wet** quru-quru/isladaraq cilalamaq; **to ~ a lens** linzanı cilalamaq; **4.** itiləmək; **to ~ a knife/an axe** bıçağı/baltanı itiləmək; **5.** itilənmək; **6.** tutqunlaşdırmaq, donuqlandırmaq; **7.** qıcırdatmaq, sürtmək; **to ~ the teeth** dişlərini qıcırdatmaq; **8.** fırlatmaq, hərləndirmək; **to ~ a coffee-mill** qəhvə dəyirmanının dəstəyini fırlatmaq; **to ~ a street-organ/a barrel-organ** şarmanka çalmaq; **9.** əzbərləmək, əzbərdən öyrənmək; **to ~ at smth.** bir şeyi əzbərləmək; **to ~ away one's English** ingilis dilini əzbərdən öyrənmək; **10.** güclə qandırmaq, başa salmaq, beyninə yeritmək; **to ~ grammar into one's head** qrammatikanı bir kəsin başına yeritmək; **to ~ smb. in grammar** bir kəsə qrammatikadan səthi məlumat vermək; **11.** əziyyət vermək, zülm etmək, incitmək; **to ~ by tyranny** zülm etmək; **to ~ down 1)** üyütmək; **2)** üyüdülmək; *This corn will grind down into a nice white flour Bu taxıldan yaxşı ağ un alınacaq;* **3)** itiləmək; **to ~ down a knife** bıçağı itiləmək; **4)** *məc.* zülm etmək, əzmək; yormaq, üzmək, təngə gətirmək; *People were ground down by poverty Yoxsulluq adamları təngə gətirmişdi; Tyrants ground down the poor Zalım hökmdarlar yoxsullara zülm edirdilər;* **to ~ in** cilalamaq; **to ~ up** axıra qədər xırdalamaq / üyütmək;
◊ **to have an axe to ~** odu öz qabağına çəkmək; öz şəxsi mənafeyini güdmək; *The mills of God grind slowly Allah gec edər, güc edər*
**grinder** ['graɪndəʳ] *n* **1.** bıçaqitiləyən, çarxçı; cilalayıcı usta; **2.** cila/cilalama maşını; **3.** bülöv daşı; **4.** kofe dəyirmanı / üyüdən; **5.** daşdoğrayan maşın; **6.** azı dişi; **7.** *d.d.* böyük buterbrod; **8.** əzbərçi *(dərsi anlamadan əzbərləyən)*; **9.** repetitor *(şagirdi evdə öyrədən müəllim)*; **10.** *pl radio.* cırıldama, xırıldama *(atmosfer boşalması nəticəsində)*
**grindery** ['graɪndərɪ] *n* **1.** yonucu karxanası, yonma emalatxanası; **2.** çəkməçi ləvazimatları
**grinding-machine** ['graɪndɪŋmə.ʃi:n] *n* **1.** cila / cilalama maşını; **2.** itiləmə dəzgahı
**grinding-mill** ['graɪndɪŋmɪl] *n tex.* **1.** dəyirman; **2.** daşdoğrayan maşın
**grinding-wheel** ['graɪndɪŋ'wi:l] *n* cilalama çarxı
**grindstone** ['graɪndstoun] *n* **1.** bülöv/çarx daşı; **2.** dəyirman daşı;
◊ **to hold / to keep / to bring / to put smb.'s nose to the ~** bir kəsi fasiləsiz / istirahət etmədən işləməyə məcbur etmək, bir kəsin nəfəsini kəsmək
**gringo** ['grɪŋgou] *n (pl* **-os** [-ouz]) əcnəbi, xarici *(Latın Amerikasında ingilisləri və amerikanları belə adlandırırlar)*
**grip¹** [grɪp] *n* **1.** bərk/möhkəm tutma, sıxma, yapışma; **to take a ~ on a rope** kəndirdən bərkbərk tutmaq/yapışmaq; **to let go one's ~ on a branch** möhkəm tutduğu budağı buraxmaq; **to come to ~s, to get to / at ~s with 1)** tutuşmaq *(güləşçilər haq.)*; **2)** *məc.* qəti/ciddi girişmək; **to get to ~s with a problem** problemə ciddi giriş-

mək, problemin həllinə ciddi cəhd etmək; **to have an iron ~, to have a ~ of steel** əli çox möhkəm/daş kimi olmaq; *His hand has lost its grip Onun əlinin gücü itib*; 2. dərhal anlama / başa düşmə / qavrama qabiliyyəti *(məsələnin mahiyyətini)*; ağlın itiliyi; **to have a good ~ of a problem / of a situation / of a subject** problemin/vəziyyətin / fənnin mahiyyətini yaxşı anlamaq /başa düşmək; *His mind has lost its grip Onun ağlı kütləşib*; 3. ələ alma qabiliyyəti; *He has a good grip on the audience O, dinləyiciləri / auditoriyanı dərhal ələ ala bilir*; 4. məngənə, zülm, əsarət; güc; nəzarət; **in the ~ of poverty** yoxsulluq məngənəsində; *The fever has got him in its grip O, qızdırma içində yanır*; **to get a ~ on oneself** özünü ələ almaq; **to lose *one's* ~** özünü saxlaya bilməmək, özünü itirmək; **to lose *one's* ~ of / on *smth.*** bir şey üzərində nəzarəti itirmək; 5. sap, dəstək, qulp, tutacaq, saplaq; **the ~ of a hammer** çəkicin sapı/ dəstəyi; 6. *tex.* sıxac, qısqac, məngənə; 7. *pl* hantel *(gimnastika aləti)*; 8. *amer.* sakvoyaj *(yol çantası)*

**grip**[2] [grıp] *v* 1. möhkəm tutmaq/yapışmaq/ sıxmaq; **to ~ *smb.'s* arm / hand** bir kəsin əlindən/ qolundan bərk tutmaq; *The frightened child gripped his mother's hand Qorxmuş uşaq anasının əlindən bərk-bərk yapışdı; The brakes failed to grip and the car ran into the wall Əyləclər tutmadı və maşın divara dəydi*; **to ~ hold of *smb./smth.*** bir kəsdən/şeydən möhkəm tutmaq; **to ~ *one's* hands on *smth.*** əlləri ilə bir şeydən tutmaq/yapışmaq; **to ~ a railing** sürahidən/məhəccərdən yapışmaq / tutmaq; 2. bürümək, əhatə etmək; *Fear gripped him Onu qorxu bürüdü; Fear gripped his heart Qorxu onun ürəyini bürüdü*; 3. anlamaq, dərhal tutmaq *(ağılla)*, dərk etmək; *I cannot grip his argument Mən onun dəlillərini anlaya bilmirəm*; 4. ələ almaq, diqqətini cəlb etmək; *The speaker gripped the attention of his audience Natiq dinləyicilərinin diqqətini özünə cəlb etdi*; 5. sıxmaq, yol verməmək, tutmaq, hərəkət etməyə qoymamaq; *The ship was gripped by the ice Buz gəmini irəliyə hərəkət etməyə qoymadı*

**grip** [grıp] *n* = **grippe**

**grip-car** ['grıpka:$^r$] *n* asma kanat yolu vaqonu

**gripe**[1] [graıp] *n* 1. sıxma, sıxac, qısqac; 2. ixtiyar, məngənə; **in the ~ of a tyran** zalımın ixtiyarında/əsarətində olma; 3. *pl* kəskin ağrı, sancı *(mədədə)*; 4. dəstək, qulp, tutacaq; 5. *d.d. amer.* ovqattəlxlik, dilxorluq, pərtlik

**gripe**[2] [graıp] *v* 1. *arx.* sıxmaq, sıxışdırmaq; **to ~ the poor** yoxsulları sıxışdırmaq; 2. sancılanmaq, ağrısı tutmaq; *He was badly griped by colic O, çox pis sancılandı*; 3. *tex.* sıxmaq, bərkitmək; 4. donquldanmaq, şikayətlənmək

**grippe** [grıp] *n tib.* qrip

**gripsack** ['grıpsæk] *n* sakvoyaj, yol çantası

**grip-vice** ['grıpvaıs] *n* sıxıcı məngənə

**grisette** [grı'zet] *n fr.* yüngül əxlaqlı qız

**grisly** ['grızlı] *adj* 1. qorxulu, dəhşətli; 2. xoşagəlməz, pis

**grist** [grıst] *n* 1. üyüdülməli taxıl; 2. döyülmüş taxıl; 3. səməni, maya; 4. *amer.* ehtiyat, çoxlu miqdarda; **a ~ of pencils** ehtiyat karandaşlar; **a ~ of matters** çoxlu iş;

◊ **to bring ~ to the mill** gəlir gətirmək, sərfəli olmaq; ≅ bir kəsin dəyirmanına su tökmək; *All is grist that comes to his mill O, əlinə keçən hər şeydən istifadə edir; ≅ O, yumurtadan yun qırxır*

**gristle** ['grısl] *n anat.* qığırdaq, ximirçək, xirtdək; *I can't eat this meat – it's all gristle Mən bu əti yeyə bilmirəm – bu başdan-başa ximirçəkdir;*

◊ **in the ~** inkişaf etməmiş, sısqa

**gristly** ['grıslı] *adj* qığırdaqlı, ximirçəkli, xirtdəkli

**grist-mill** ['grıstmıl] *n* un dəyirmanı

**grit**[1] [grıt] *n* 1. *toplu isim. fel. tək iş.* qum, iri qum, çınqıl; *I've got some grit in my shoe Ayaqqabıma qum dolub / girib; Grit clogs the works Qum mexanizmi çirkləndirir*; 2. metaldan tökmə şeyləri təmizləmək üçün qırma; 3. *d.d.* möhkəmlik, səbat, dözüm, mətanət; **to have plenty of ~** güclü iradə sahibi olmaq; *The soldiers showed that they had plenty of grit Əsgərlər nümayiş etdirdilər ki,/göstərdilər ki, onlar güclü iradəyə malikdirlər*;

◊ **to put/to throw a little ~ in the machine /bearings** ≅ badalaq gəlmək, işə mane olmaq /əngəl törətmək/pəl vurmaq

**grit**[2] [grıt] *v* 1. qıcırdatmaq *(dişi)*, cırıldamaq, xışıldamaq; **to ~ *one's* teeth** 1) dişlərini qıcırdatmaq; *We just had to grit our truth and get on with the job Biz canımızı dişimizə tutaraq işə girişdik; The sanded floor grits beneath the tread Üstünə qum tökülmüş döşəmə ayaq altında xışıldayır*; 2) *məc.* canını dişinə tutmaq, mətinlik və dözümlülük nümayiş etdirmək; 2. qum / çınqıl səpmək / tökmək

**grits** [grıts] *n pl* 1. yulaf yarması; 2. iri üyüdülmüş yulaf unu

**gritstone** ['grıtstoun] *n geol.* iridənəli qumdaşı

**gritty** ['grıtı] *n* 1. qumlu, qumsal; 2. qumu olan; *The bread was gritty Çörəyin içində qum var idi; The sandstorm made the food gritty Səmum yeli yeməklərin içini qumla doldurdu*; 3. *amer.* cəsur, möhkəm, dözümlü

**grizzle**[1] ['grızl] *n* 1. boz rəng; 2. ağ tük, ağ / çal saç, ağarmış / çallaşmış saç; 3. boz parik; 4. boz at; 5. çiy kərpic

**grizzle**[2] ['grızl] *adj* 1 boz; 2. çal, çallaşmış

**grizzle**[3] ['grızl] *v* I 1. bozartmaq; 2. bozarmaq; 3. çallaşmaq, ağarmaq

**grizzle** ['grızl] *v* II 1. həyəcanlanmaq, təşvişə



düşmək, narahat olmaq; 2. donquldanmaq, gileylənmək; ağlamaq, sızıldamaq, ağlayıb-sızlamaq; 3. şıltaqlıq / naz etmək *(uşaq haq.)*

**grizzled** ['grızld] *adj* 1. ağarmış, çallaşmış; 2. boz, bozumtul

**grizzly**[1] ['grızlı] *n* 1. qoruyucu şəbəkə; 2. diyircəkli transportyor

**grizzly**[2] ['grızlı] *adj* 1. boz, bozumtul; 2. çallaşmış, ağarmış

**groan**[1] [groun] *n* 1. inilti, zarıltı; **the ~s of the wounded** yaralıların iniltiləri; *We heard the groans of the injured men Biz xəsarət almış adamların iniltilərini eşitdik;* 2. boğuq cırıltı; **the ~ of the door** qapının boğuq cırıltısı; 3. fəryad, ah-vay, səs-küy, uğultu, gurultu; **the ~s of disapproval** narazılıq uğultusu/fəryadı; *His speech was interrupted by groans of disapproval Narazılıq uğultusu onun çıxışını yarımçıq qoydu/kəsdi*

**groan**[2] [groun] *v* 1. inildəmək, zarıldamaq, ufuldamaq, ah-vay / ax-uf etmək; *The wounded men lay there groaning, with no one to help them Yaralılar yerə sərilərək inildəyirdilər, orada onlara yardım edəcək bir kimsə belə yox idi*; **to ~ in / with pain** ağrıdan inildəmək; *The teacher groaned with dismay Müəllim təlaş içində inildədi; The wind groans Külək vıyıldayır*; 2. **(to ~ under/beneath/with)** üzülmək, əldən düşmək, usanmaq, zülmdən inildəmək, ağırlıqdan sınmaq/usanmaq; *The people groaned under injustice Xalq ədalətsizlikdən usanmışdı;* 3. içini çəkə-çəkə danışmaq/nağıl etmək; *He groaned (out) his sad story O, içini çəkə-çəkə öz başına gələn qəmli qəziyyəni/ hadisəni danışdı;* 4. cırıldamaq, şaqqıldamaq, xışıldamaq; *The door groans on its hinges Qapının həncaması /rəzəsi cırıldayır; The ship's timbers groaned during the storm Fırtına zamanı gəminin taxta örtüyü cırıldayırdı;* **to ~ down** hay-küylə danışanı susmağa məcbur etmək; *The speaker was groaned down by the audience Zalı bürüyən hay-küy natiqi susmağa məcbur etdi*

**groaning-chair** ['grounıŋ'tʃeə$^r$] *n* doğum kreslosu *(doğum evində)*

**groat** [grout] *n* 1. dörd pens dəyərində gümüş pul/sikkə; 2. cüzi məbləğ; **without a ~** bir qəpiyi də yox; qəpik-quruşsuz; *məc.* lüt;

◊ **not worth a ~** bir qəpiyə dəyməz; **not to care a ~** saymamaq, heç bilməmək, adam yerinə qoymamaq; *I can't care a groat Mənim üçün fərqi yoxdur, Mənim vecimə də deyil*

**groats** [grouts] *n* 1. yulaf yarması; 2. ələnməmiş un

**grocer** ['grousə$^r$] *n* baqqal

**grocery** ['grousərı] *n* 1. baqqal köşkü/dükanı, baqqaliyyə mağazası; 2. baqqaliyyə malları *(yeyinti şeyləri)*; 3. yeyinti məhsulları malları

**grocery shop** ['grousərı'ʃɔp] *n* = **grocery**

**grog**[1] [grɔg] *n* 1. qroq *(spirtlə suyun qarışığından alınan içki)*; 2. punş; 3. qroq *(isti şərbət qarışdırılan araq və ya rom)*

**grog**[2] [grɔg] *v* 1. qroq / punş içmək; 2. spirti suya qatıb içki hazırlamaq

**grog-blossom** ['grɔg.blɔsəm] *n d.d.* qızarmış burun *(əyyaşlarda)*

**groggery** ['grɔgərı] *n* 1. şərab köşkü; 2. çaxır anbarı

**groginess** ['grɔgınıs] *n* 1. sərxoş vəziyyət; 2. sərxoşluq; 3. ayaq üstə dura bilməmə; 4. qətiyyətsizlik

**groggy** ['grɔgı] *adj* 1. kefli, sərxoş; 2. içməyi sevən; 3. zəif; ayaq üstə dura bilməyən; **to be ~ after illness** xəstəlikdən sonra zəif olmaq; *The last attack of flu left me rather groggy Son qripə tutulma məni çox zəif saldı*; 4. *id.* səndələyən *(zərbədən sonra boksçunun vəziyyəti)*; 5. möhkəm olmayan, laxlayan; **a ~ table** laxlayan masa; *The legs of that chair look rather groggy O stulun ayaqları çox laxlayır*

**grog-shop** ['grɔgʃɔp] *n* = **groggery**

**groin**[1] [grɔın] *n* 1. *anat.* qasıq; 2. *mem.* xaçşəkilli qübbə, xaçşəkilli tağtavanın qabırğası / tili

**groin**[2] [grɔın] *v* xaçşəkilli qübbə qoymaq

**groom**[1] [gru:m] *n* 1. süvari xidmətçi, nökər *(ekipajı və ya süvarini müşayiət edən xidmətçi)*; 2. mehtər, atabaxan; 3. bəy *(adaxlı oğlan)* *(**bridegroom**-un qısa forması)*; 4. kamerdiner, otaq xidmətçisi *(ağaların xüsusi xidmətçisi)*;

**Groom of the Chamber** kamerdiner

**groom**[2] [gru:m] *v* 1. ata baxmaq; 2. atı tumarlamaq /təmizləmək; 3. qulluq etmək, tumarlamaq, bəsləmək, yaxşı baxmaq, qayğısını çəkmək, nazlamaq, pərvəriş vermək; *A female ape was grooming her mate Dişi meymun öz erkəyini tumarlayırdı;* **to be well ~ed** yaxşı geyinib-kecinmək, səliqəli daranmaq, şux görünmək və s.; 4. *amer.* müəyyən bir fəaliyyət sahəsi üçün hazırlamaq; *He was groomed for political office O, siyasi karyera üçün hazırlanmışdı*

**groomer** ['gru:mə$^r$] *n* 1. mexaniki şotka; 2. qaşov *(atları təmizləmək üçün)*

**groomsman** ['gru:mzmən] *n* *(pl* **-men** [mən]) sağdış, soldış *(bəyin)*

**groove**[1] [gru:v] *n* 1. novça, novcuq; 2. *tex.* nov, oyuq, yuva *(şkivin - inteqral çarxında)*, yarıq *(sürüşən pəncərə/qapı tağının hərəkət etməsi üçün çərçivədə açılan yarıq/nov)*; 3. qrammafon valının üzərindəki kiçik yivlər; 4. suyun yerdə açdığı şırım, uzun balaca çay yatağı; *The river has cut a deep groove through the plain Düzənlikdən keçən çay özünə dərin yataq açıbdır;* 5. *məc.* yol, cığır, vərdiş, görənək; **to get into a ~ / to be stuck in a ~** qaydasına / yoluna düşmək; **to move / to run in a ~** adi/tapdanmış yolla / cığırla getmək; öz qay-

dasilə getmək; **to get out of a ~** yolundan çıxmaq; **to fall back into the old ~** əvvəlki vərdişlərə qayıtmaq, köhnə yola dönmək; *His mind works in a narrow groove O, dar düşüncəli adamdır;* **6.** yiv *(tüfəngdə);* **7.** *d.d.* mədən, şaxta

**groove[2]** [gru:v] *v tex.* nov/yarıq/yiv/qanov açmaq; **to ~ and tongue** *tik.* şpunt və zivana ilə kipləşdirmək

**groover** ['gru:vər] *n sl.* müasir adam, zəmanə adamı

**groovy** ['gru:vı] *adj* müasir, bugünkü dəblə səsləşən; ~ **clothes/people/restaurant** müasir dəbli geyimlər /adamlar/ restoran

**grope** [group] *v* **1.** əlləmək, əllə yoxlamaq, əlini sürtə-sürtə/fəhmlə/hisslə getmək; **to ~ in the dark** qaranlıqda əllə yoxlaya-yoxlaya / fəhmlə hərəkət etmək; *We groped our way out of the room Biz qaranlıq koridorda fəhmlə/əlimizlə yoxlaya-yoxlaya getdik;* **2. (for, after)** fəhmlə /hisslə/kor-koranə axtarmaq, əl ilə yoxlayıb tapmaq *(həm məc.);* **to ~ for** *smb.'s* **hand** bir kəsin əlini əli ilə axtarmaq; **to ~ for the door-handle** fəhmlə/əli ilə yoxlaya-yoxlaya qapının dəstəyini axtarmaq; **to ~ for an answer** cavab axtarmaq; **to ~ after the truth** həqiqəti axtarmaq

**grosbeak** ['grousbı:k] *n zool.* baltadimdik *(balaca oxuyan quş)*

**gross[1]** [grous] *n* **1. in (the) ~ 1)** ümumiyyətlə, bütövlüklə; **2)** topdan, topdansatış; **a dealer in ~** topdansatış taciri; **the ~ of the army/of the people** hamılıqla, ellikcə, əksəriyyət, dəstə ilə; **2.** *arx.* ordunun böyük hissəsi, xalqın əksəriyyəti

**gross[2]** [grous] *adj* **1.** kobud, bayağı, ədəbsiz, şit, qaba; **to speak in a ~ manner** kobud tərzdə danışmaq; **to use ~ terms/ language** ədəbsiz ifadələr işlətmək, söyüş söymək; **2.** biabırçı, yolverilməz, görünməmiş; a ~ **error/mistake /blunder** biabırçı/yolverilməz/görünməmiş səhv; a ~ **insult** yolverilməz təhqir; **3.** qaba, yağlı *(qida haq.);* **a ~ eater / feeder** yağlı qaba yeməkləri xoşlayan adam; **4.** duyğusuz, qeyri-həssas, hissiz, hissi kütləşmiş, kobud; ~ **ear** qeyri-həssas eşitmə qabiliyyəti; **to have ~ nerves** möhkəm əsəblərə malik olmaq; duyğusuz/hissi kütləşmiş/ korazehin olmaq; **5.** böyük, iri, yekə; **a ~ animal** iri heyvan; **a ~ man** kök /tosqun adam; **6.** sıx, qalın; ~ **material** qalın material/parça; ~ **darkness** qatı qaranlıq; *The darkness was so gross that it might be felt Qaranlıq elə qatı idi ki, sanki onu əllə hiss etmək olardı;* **7.** ümumi *(xərci çıxarılmamış),* brutto *(malın tara ilə birlikdə çəkisi);* ~ **output** ümumi məhsul; ~ **income** ümumi gəlir; ~ **amount** ümumi məbləğ; ~ **weight** brutto çəki; ~ **tonnage** ümumi tutum/tonnaj

**gross[3]** [grous] *v* yekun məlbəği / ümumi qiyməti olmaq; *His last film grossed five million pounds Onun son filmi beş milyon funta başa gəldi*

**grossly** ['grouslı] *adv* **1.** kobud, qaba-qaba, kobudcasına; **to answer ~** kobud cavab vermək; **to be ~ mistaken** kobud səhv etmək; **2.** topdansatışla

**gross-ton** ['grous'tʌn] *n* ingilis tonu (=1016,06 kq)

**grot** [grɔt] *n* = **grotto**

**grotto** ['grɔtou] *n (pl* **-oes, os** [-ouz]) mağara, zağa, kaha, küyül, dəstə

**grouch[1]** [grautʃ] *n* **1.** *d.d.* pis əhval-ruhiyyə, xiffət, darıxma, ürəyi sıxılma, qüssə; **2.** inciklik, incimə, küsü; **to have a ~ on / against** *smb.* bir kəsdən incimək; **3.** deyingən, daim donquldanan, mızı *(adam)*

**grouch[2]** [grautʃ] *v d.d.* donquldanmaq, mızıldamaq, deyinmək, söylənmək

**ground[1]** [graund] *n* **1.** yer, yerin səthi; **on English ~** ingilis torpağında; **on firm ~** quruda; **to lie on the ~** torpağın üstündə uzanmaq; **2.** torpaq, süxur, bərk torpaq; **fertile/barren/boggy/sandy ~** münbit/ münbit olmayan/bataqlıq / qumsal torpaq; **to break ~** torpağı şumlamaq/qazmaq/qazıb açmaq; **to till the ~** torpağı becərmək; **to break fresh ~** xam torpağı əkmək/ sürmək; **3.** torpaq sahəsi; **4.** *pl* bağ, park; mülkün/evin / malikanənin ətrafında olan sahə; *The mansion has extensive grounds Malikanənin ətrafında geniş sahə var;* **5.** meydança, idman meydançası (*həm də* **sports ~s**); **a building ~** tikinti meydançası; **a football ~** futbol meydançası; **6.** rayon, vilayət, ölkə, yer; **a level/flat/rising ~** düz / yastı/yoxuş yer; **7.** fon *(üzərində şəkil çəkilən əsas rəng/ton; şəkilin arxa planı),* rəng astarı, astarlanma; **green upon a ~ of gold** qızıl rəng fonunda yaşıl rəng; **8.** əsas, özül, səbəb, motiv; **to have ~(s) for saying** *smth.* bir şeyi deməyə əsası olmaq; *I have good grounds for believing his version of events Mənim onun gəldiyi nəticələrə inanmağa yaxşı əsasım var;* **to have no ~ for anxiety** narahatlığa əsas olmamaq; *There are no grounds for anxiety Narahat olmağa heç bir əsas/səbəb yoxdur; What are the grounds for divorce in this country Bu ölkədə boşanmaların səbəbləri nədir?;* **on the ~s of** əsasında, səbəbdən; **on both these ~s** bu iki səbəbdən; **on personal ~s** şəxsi mülahizə əsasında; *On what grounds? Nə əsasla?; On what grounds do you suspect him? Nə əsasla sən/siz ondan şübhələnirsən?/şübhələnirsiniz?;* **9.** mövzu, obyekt; **forbidden ~** qadağan/yasaq olunmuş mövzu; **debatable ~** mübahisə obyekti; **10.** *pl* xılt, çöküntü; **coffee ~s** kofe xıltı; **11.** bünövrə, özül, təməl; əsas, əsas prinsip; **12.** yuva; **to run to ~** yuvaya salmaq; **to go to ~** yuvada gizlənmək *(tülkü haq.);* **13.** yerlə



birləşdirmə *(elektrik dövrəsini);*
◊ **above ~** sağ olma, diri; **below ~** gorda, ölmüş; **to be on the ~** dueldə vuruşmaq; **from the ~ up** əsaslı, tamamilə; **on** *one's* **own ~** öz mühitində; evdə; **to gain ~ on** *smb.* bir kəsə qalib gəlmək; **to gain/to gather / to get ~ 1)** irəli getmək; uğur qazanmaq; **2)** yayılmaq; **to cover much ~** uzaq məsafəni qət etmək; *We've covered a great of ground to-day Bu gün biz böyük bir məsafəni qət etmişik;* **to lose / to give ~** geriləmək, geri çəkilmək; öz mövqeyini itirmək; **to keep / to hold / to maintain/to stand** *one's* **~** öz mövqeyini əldən verməmək, geri çəkilməmək, öz dediyindən dönməmək; **to shift** *one's* **~** mübahisədə mövqeyini dəyişmək; mübahisənin gedişində öz nöqteyi-nəzərini dəyişmək

**ground[2]** [graund] *adj* I quru; ~ **troops/ forces** quru qoşunları; ~ **operations** quruda aparılan hərbi əməliyyatlar; ~ **defence** hava hücumundan müdafiə

**ground** [graund] *adj* II üyünmüş, üyüdülmüş, doğranmış; ~ **coffee** üyüdülmüş qəhvə; ~ **rice** üyüdülmüş düyü; ~ **hay** doğranmış ot

**ground[3]** [graund] *v* **1.** dənizin dibinə oturmaq; *The ship grounded Gəmi suya/quma oturdu;* **2.** *av.* yerdə qalmaq, havaya qalxa bilməmək, yerdə qalmağa məcbur olmaq; *The planes were grounded by fog yesterday Duman görə təyyarələr dünən havaya qalxa bilmədilər; The fog grounded aircraft at London Airport yesterday Dünən duman bütün uçaqları London aeroportunda qalmağa məcbur etdi;* **3.** yerə qoymaq, təhvil vermək; **to ~ arms** *hərb.* silahları yerə qoymaq; **4.** əsaslandırmaq; **to ~** *one's* **arguments on facts** öz dəlillərini faktlarla əsaslandırmaq; *This theory is well/ill grounded Bu nəzəriyyə yaxşı/ pis əsaslandırılıb;* **5. (in)** əsasını öyrətmək/öyrənmək *(fənnin);* **to ~** *smb.* **in mathematics** bir kəsə riyaziyyatın əsaslarını öyrətmək; *The teacher grounded his pupils in arithmetic Müəllim şagirdlərinə hesabı dərindən öyrətdi;* **6.** lətini təmizləmək *(dərinin);* **7.** astar vurmaq; özül qoymaq, him atmaq; **8.** *el.* yerlə birləşdirmək

**ground** [graund] **to grind** *felinin pp. pt formaları*

**ground-colour** ['graund.kʌlər] *n* astar, fon; rəng astarı

**ground-floor** ['graund'flɔ:r] *n* birinci/aşağı /kürsülük mərtəbə

**ground-game** ['graundgeım] *n* quruda yaşayan ov heyvanları *(xəzli ov heyvanları)*

**ground-hog** ['graundhɔg] *n zool.* marmot *(gəmirici heyvan)*

**ground-ice** ['graundaıs] *n* alt buz qatı

**ground-in** ['graund'ın] *adj tex.* cilalanıb uyğunlaşdırılmış, sürtülüb kipləşdirilmiş

**grounding** ['graundıŋ] *n* **1.** suyun dibinə oturma; **2.** *av.* havaya qalxmanın qadağan olunması; **3.** əsas, özül, bünövrə; **4.** bir fənnin əsaslarını öyrənmə; **a good ~ in English grammar** ingilis dili qrammatikasının əsaslarını yaxşı öyrənmə; **5.** *el.* yerə qoşma; **6.** astar vurma

**groundless** ['graundlıs] *adj* səbəbsiz, əsassız, zəminsiz; ~ **fears** səbəbsiz qorxular; ~ **rumours** əsassız şayiələr

**ground-man** ['graunmæn] *n (pl* **-men** [mən]) **1.** yerqazan fəhlə, qazmaçı; **2.** idman meydançasına qulluq edən şəxs

**ground-nut** ['graundnʌt] *n bot.* yerfındığı, araxis

**ground-oak** ['graund'ouk] *n* **1.** palıd pöhrəsi; **2.** cırtdan palıd ağacı

**ground-pea** ['graundpı:] *n* = **ground-nut**

**ground-rent** [graundrent] *n* torpaq rentası *(tikinti üçün ayrılmış torpaq sahəsi üçün ödənilən)*

**ground-rice** ['graund.raıs] *n* düyü yarması

**groundsel** ['graunsl] *n* I *bot.* xaçgülü

**groundsel** ['graunsl] *n* II **1.** tir; **2.** əsas prinsip

**ground-sill** ['graunsıl] *n* = **groundsel II 1.**

**groundsman** ['graunzmən] *n (pl* **-men** [-mən]) = **groundman 2**

**ground-squirrel** ['graund.skwırəl] *n zool.* burunduk *(gəmirici heyvan)*

**ground-swell** ['graundswel] *n* **1.** küləksiz/ yastı/uzun təpə; **2.** gəmilərin hərəkəti nəticəsində yaranan ləpə

**ground-to-air (guided) missile** ['graundtə 'eə (gaıdıd) 'mısaıl] *n hərb.* "yer-hava" tipli idarəolunan raket

**ground-to-ground missile** ['graundtə' graund'mısaıl] *n hərb.* "yer-yer" tipli raket

**ground-to-plane missile** ['graundtə 'pleın 'mısaıl] *n* = **ground-to-air missile**

**ground-to-sea missile** ['graundtə'si:'mısaıl] *n hərb.* "yer-gəmi" tipli idarəolunan raket

**ground-to-ship missile** ['graundtə'ʃıp 'mısaıl] *n* = **ground-to-sea missile**

**ground-to-underwater missile** ['graund tə .ʌndə'wɔ:tə'mısaıl] *n hərb.* "yer-sualtı hədəf" tipli raket

**groundward** ['graundwəd] *adj* yerə yönəldilmiş / istiqamətləndirilmiş

**ground-water** ['graund.wɔtər] *n* torpaqaltı /yeraltı su

**groundwork** ['graundwə:k] *n* əsas, süjet; **the ~ of the novel** romanın əsası/süjeti

**group[1]** [gru:p] *n* **1.** qrup, dəstə; **a ~ of people** bir qrup adam; *People were standing in small groups Adamlar kiçik qruplarla dayanmışdılar;* **2.** *pl* dairə, təbəqə; **business ~s** işgüzar dairələr; **3.** sinif, qrup; **a ~ of fish/plants** balıqlar sinfi; bitki qrupu; **the Germanic ~ of languages** German dilləri qrupu; **4.** *hərb.* aviasiya qrupu; **5.** *kim.* radikal *(dəyişmədən bir kimyəvi birləşmədən başqasına keçən atomlar qrupu)*

**group²** [gru:p] *v* 1. qruplaşdırmaq, yerləşdirmək, düzmək; *These figures are well grouped Bu fiqurlar yaxşı yerləşdirilib; I don't know how to group these figures Mən bilmirəm, bu fiqurları necə yerləşdirim/düzüm;* 2. qruplaşmaq, toplaşmaq; əhatəyə / dairəyə almaq; *The police grouped round the demonstrators Polislər nümayişçiləri əhatəyə/ dairəyə aldılar; The children grouped round the hero Uşaqlar qəhrəmanı əhatəyə/dövrəyə aldılar;* 3. qruplara bölmək / ayırmaq, təsnif etmək; **to ~ languages** dilləri təsnif etmək; 4. yaxşı yaraşmaq, uyğun gəlmək; *The buildings group splendidly in the landscape Binalar mənzərəyə çox yaxşı yaraşır*

**groupage** [ˊgru:pıdʒ] *n* qruplaşdırma; qruplaşdırılma

**grouse¹** [graus] *n* I *(cəmdə dəyişmir) zool.* tetra quşu; **~ shooting** tetra quşu ovu

**grouse** [graus] *n d.d.* II 1. donquldanma, deyinmə, mırıldama; *He enjoys a good grouse Onun donquldanmaqdan xoşu gəlir;* 2. deyingən, mızı *(adam)*

**grouse²** [graus] *v* I tetra quşu ovlamaq

**grouse** [graus] *v* II donquldanmaq, deyinmək, mırtıldamaq

**grouser** [ˊgrausəʳ] *n* 1. *avto.* şpora, yerəilişmə; 2. tırtıl başmağı *(traktorun və s.)*

**grout¹** [graut] *n duru sement və ya əhəng məhlulu*

**grout²** [graut] *v* I məhlul tökmək

**grout** [graut] *v* II yeri eşmək *(donuz haq.)*

**grouty** [ˊgrautı] *adj* I *d.d.* hirsli, deyingən

**grouty** [ˊgrautı] *adj* II qatı, yapışqan, palçıqlı

**grove** [grouv] *n* ağaclıq, balaca meşə

**grovel¹** [ˊgrɔvl] *n* köləcəsinə səcdə/sitayiş, yaltaqlıq, riyakarlıq

**grovel²** [ˊgrɔvl] *v* 1. üzüüstə/üzüqoylu düşüb səcdə etmək, alçalmaq, diz çökmək; 2. sürünmək, yaltaqlanmaq; **to ~ before/ to *smb.*** bir kəsə yaltaqlanmaq/quyruq bulamaq; **to ~ at *smb.'s* feet** bir kəsin ayaqlarına düşüb yalvarmaq; *Shall I grovel at the feet of a conqueror?! İşğalçının ayaqlarına düşüb yalvarımmı?!*

**groveller** [ˊgrɔvləʳ] *n* yaltaq, ikiüzlü, alçaq, riyakar

**grow** [grou] *v* (*pt* **grew** [gru:], *pp* **grown** [groun]) 1. böyümək, boy atmaq, uzanmaq; *How quickly you are growing! Sən/ Siz necə də sürətlə böyüyürsən!/böyüyürsünüz!; How tall you have grown! Gör nə boyda olmusan!/olmusunuz;* **to ~ in size** ölçüsü böyümək; *She has decided to let her hair grow O, saçlarını uzatmaq qərarına gəlib; He has grown into a fine young man O böyüyüb qəşəng bir oğlan olub;* 2. artmaq, güclənmək; *The pain is growing Ağrı güclənir; My difficulties are growing Çətinliklərim artır;* 3. bitmək, yetişmək; *The olive grows in Italy Zeytun İtaliyada yetişir/bitir; Roses grow in the garden Qızılgül bağda yetişir/bitir;* 4. yetişdirmək, becərmək; bitmək; **to ~ corn/wheat/melons** qarğıdalı/buğda/yemiş yetişdirmək/becərmək; *This soil will not grow fruit-trees Bu torpaqda meyvə ağacı yetişməz/bitməz;* 5. uzatmaq, qoymaq; **to ~ a moustache** bığ qoymaq; *The stag grows fresh antlers every year Maralın hər il təzə buynuzları çıxır;* 6. *Mürəkkəb ismi xəbərdə bağlayıcı fel olur. Bu halda* **to grow** *feli + ismi xəbərin ad hissəsi Azərbaycan türkcəsinə müvafiq məsdər vasitəsilə tərcümə olunur:* **to ~ angry** hirslənmək; **to ~ big** böyümək; yoğunlaşmaq, kökəlmək; **to ~ old** qocalmaq; **to ~ young** cavanlaşmaq; **to ~ dark** qaralmaq, qaranlıqlaşmaq; *It is growing dark Qaş qaralır;* **to ~ light** işıqlaşmaq; **to ~ better** yaxşılaşmaq; **to ~ on/upon *smb.*** 1) kök salmaq, təsir etmək/göstərmək; **a habit that ~s on him** onda kök salan vərdiş; 2) getdikcə çox xoş/maraqlı gəlmək, maraqlandırmaq, özünə çəkmək/ cəlb etmək; *This picture-book grows on me Bu şəkilli kitab mənə getdikcə daha xoş gəlir; The book seems uninteresting at first, but it grows on you Bu kitab əvvəlcə maraqsız görünür, ancaq getdikcə adamı özünə daha çox cəlb edir;* **to ~ down/downwards** azalmaq, qısalmaq; **to ~ in** ətə girmək /batmaq *(dırnaq haq.);* **to ~ near** *arx.* yaxınlaşmaq; *It grows near harvest Biçin vaxtı yaxınlaşır;* **to ~ out** cücərmək, göyərmək; **to ~ out of *smth.*** 1) bir şeydən əmələ/meydana gəlmək, baş vermək; *This state grew out of a few small towns Bu dövlət bir neçə balaca şəhərdən əmələ gəlmişdir;* 2) tərgitmək, yadırğamaq; *He has grown out of the bad habits of his childhood days O, uşaqlıq çağlarının pis vərdişlərini yadırğayıb;* 3) içinə sığmamaq, çox böyük olmaq, ...dərəcəsinə çatmaq; *He has grown out of his clothes O, çox böyüyüb, paltarları ona dar gəlir;* 4) səbəb/mənbə olmaq, irəli gəlmək; *His troubles grew out of his bad temper Onun bəlaları çox pis/murdar xasiyyətindən irəli gəldi;* **to ~ together** bitişmək, qovuşmaq; **to ~ up** 1) böyümək, həddi-büluğa çatmaq; *When the children grow up, their voice alter Uşaqlar böyüyəndə səsləri dəyişir;* 2) yaranmaq, təşəkkül tapmaq, əmələ gəlmək; *A warm friendship grew up between us Bizim aramızda səmimi bir dostluq yarandı*

**grower** [ˊgrouəʳ] *n* 1. bağban, meyvəçi, meyvəçilik mütəxəssisi; 2. bitki; **fast / free/rapid ~** tezböyüyən bitki; **shy / slow ~** gecböyüyən bitki

**growing¹** [ˊgrouıŋ] *n* 1. böyümə, boyatma; 2. yetişdirmə, becərmə; **~ of bees** arıçılıq; **~ of grapes** üzümçülük; 3. *bot.* vegetasiya dövrü; 4. boyatma xəstəliyi

**growing²** [ˊgrouıŋ] *adj* 1. böyüyən, boy atan, güclənən; 2. bitkinin inkişafına kömək edən; **~ weather** bitkinin inkişafına kömək edən hava; **~ ration** *k.t.* kökəltmə rasionu/yem miqdarı

**growl¹** [graul] *n* 1. mırıltı, mırıldama; **~ of a dog**



itin mırıltısı; 2. donquldanma, deyinmə; 3. gurultu, şaqqıltı, gumbultu *(ildırım haq.)*

**growl²** [graul] *v* 1. mırıldamaq, çımxırmaq; *The dog growled at me It mənə mırıldadı;* 2. **(out)** donquldanmaq, deyinmək, çımxırmaq, çəmkirmək; **to ~ out a refusal** çımxırıb rədd etmək; *"Get out!", he growled "Rədd ol!" deyə o çımxırdı;* 3. guruldamaq; şaqqıldamaq, nərə çəkmək; *We heard the thunder growling in the distance Biz uzaqda göy gurultusu eşitdik*

**growler** [ˊgrauləʳ] *n* 1. deyingən/donquldanan adam; 2. suyun səthində üzən buz dağı; 3. köhnə dəbli dördçarxlı minik arabası; 4. *el. xətlərarası qısa qapanmanı tapmaq üçün istifadə olunan cihaz*

**grown¹** [groun] *adj* böyük, yaşlı, yaşa dolmuş

**grown²** [groun] **to grow** *felinin pp forması*

**grown-up¹** [ˊgrounʌp] *n* böyük/yaşlı adam

**grown-up²** [ˊgrounʌp] *adj* yaşlı, böyük

**growth** [grouθ] *n* 1. böyümə, inkişaf; **full ~** tam inkişaf; *At what age does an elephant reach full growth? Fil neçə yaşında tam böyümüş olur?* **the rapid ~ of our economy** iqtisadiyyatımızın sürətli inkişafı; 2. artım; **the ~ of the population** əhalinin artımı; 3. becərmə, yetişdirmə; **the ~ of fruit** meyvə yetişdirmə/becərmə; **apples of foreign ~** gətirilmiş/idxal edilmiş almalar; **wine of *one's* own ~** öz üzümündən hazırlanmış çaxır; 4. bəhər, məhsul; **the best ~s of France** Fransanın ən gözəl məhsulları; 5. bitki, pöhrə; **a thick ~ of bushes** qalın / sıx kol pöhrələri; 6. tük çıxma; *He had a week's growth on his chin O, bir həftədir ki, üzünü təraş etmir;* 7. *tib.* şiş; **malignant / cancerous ~** bədxassəli şiş, xərçəng şişi

**growth-ring** [ˊgrouθrıŋ] *n* illik qat *(ağacda)*

**groyne¹** [grɔın] *n* 1. dalğasındıran, dalğaqıran *(limanı dalğa təsirindən qorumaq üçün bənd)*; 2. qum və çınqılın qarşısını almaq üçün bənd

**groyne²** [grɔın] *v* 1. dalğasındıran inşa etmək; 2. sahili dalğaqıranlarla qorumaq

**grub¹** [grʌb] *n* I 1. *zool.* sürfə, kəpənək qurdu, qurd, bala, arı sürfələri; 2. günəmuzd ədəbi işçi, kompilyator; 3. çox pinti adam; 4. *amer.* əzbərçi; 5. torpaq təmizləndikdən sonra yerdə qalan rişə / kök; 6. yerlə atılan top *(kriketdə)*

**grub** [grʌb] *n* II *sl.* yeməli qida, daşdan yumşaq hər şey

**grub²** [grʌb] *v* I 1. belləmək; 2. kökündən çıxartmaq, kökləmək, *(həm də* **to ~ up/ out)**; **to ~ up weeds** alaq otlarını kökündən çıxartmaq; **to ~ up stumps** kötükləri çıxartmaq; 3. eşələnmək, araşdırmaq; *The pigs were grubbing about among the trees Donuzlar ağacların arasında eşələnirdilər;* **to ~ about in a library** kitabxanada araşdırma aparmaq, məc. eşələnmək; 4. çox işləmək, işləyib əldən düşmək *(həm də* **to ~ on / along / away)**

**grub** [grʌb] *v* II aşırmaq, acgözlüklə yemək, tıxmaq *(yeməyi)*

**grub-ax(e)** [ˊgrʌbæks] *n* alaqvuran kərki/ toxa

**grubber** [ˊgrʌbəʳ] *n* 1. alaqçı, alaqvuran; 2. kötükçıxaran; 3. kötükçıxaran maşın

**grubbiness** [ˊgrʌbınıs] *n* pintilik, səliqəsizlik

**grubbing-hoe** [ˊgrʌbıŋhou] *n* kərki, toxa

**grubby** [ˊgrʌbı] *adj* 1. pinti, səliqəsiz, çirkli; 2. qurdlu

**Grub-street** [ˊgrʌb.stri:t] *n* 1. Qrab-Strit *(Londonda küçə)*; 2. jurnal kompilyatoru /mühərriri, cızma-qaraçı, dəyərsiz yazıçı;

◊ **~ work** ədəbi xaltura, başdansovma iş

**grudge¹** [grʌdʒ] *n* narazılıq, bədxahlıq, qərəzkarlıq, paxıllıq, həsəd, qibtə; **to have / to bear *smb.* a ~, to nurse / to cherish a ~ against *smb.*** bir kəsə qarşı kin saxlamaq/qərəzli olmaq; *I bear him no grudge Mən ona qarşı qərəzli deyiləm; He has a grudge against me O mənə qarşı kin saxlayır*

**grudge²** [grʌdʒ] *v* 1. heyfi gəlmək, əsirgəmək, könülsüz izn vermək; gözü qalmaq, çox görmək; *His cruel master grudged him even the food he ate Onun qəddar ağası ona hətta bir qarın çörəyi də çox görürdü; I grudge paying £ 2 for a bottle of wine that is not worth 50 p. 50 pens dəyəri olmayan bir şüşə şəraba 2 funt verməyə heyfim gəlir / əlim gəlmir;* 2. paxıllıq etmək, həsəd aparmaq, qibtə etmək; *I don't grudge him his success Mən onun uğuruna qibtə etmirəm;* 3. *arx.* deyinmək, donquldanmaq

**grudging** [ˊgrʌdʒıŋ] *adj* 1. xəsis; simic, dargöz; 2. *məc.* çox az/cüzi, əhəmiyyətsiz; **~ praise** əhəmiyyətsiz/cüzi tərif

**grudgingly** [ˊgrʌdʒıŋlı] *adv* könülsüz halda, əli əsəəsə, istəməyə-istəməyə, istəməyərək; *His employer grudgingly raised his salary Sahibkarı onun məvacibini könülsüz halda /əli əsə-əsə artırdı*

**gruel¹** [gruəl] *n* duru yulaf sıyığı / horrası; lığ, lıqqa *(sıyıq haq.)*;

◊ **to have/to get / to take *one's* ~** ciddi tənbeh olunmaq, qulaqburması almaq; **to give *smb.* his ~** bir kəsə qulaqburması vermək

**gruel²** [gruəl] *v* 1. ciddi cəzalandırmaq, çubuqla döymək; 2. əldən salmaq, üzmək

**gruelling¹** [ˊgruəlıŋ] *n* ağır cəza; sərt davranış

**gruelling²** [ˊgruəlıŋ] *adj* çox ağır, çox üzücü, əldən salan; **a ~ race** ağır / üzücü qaçış yarışı; **to give *smb.* a ~ time** bir kəslə çox sərt rəftar etmək

**gruesome** [ˊgru:səm] *adj* dəhşətli, qorxulu; **a ~ sight** dəhşətli mənzərə; **a ~ story** dəhşətli hadisə/əhvalat

**gruff** [grʌf] *adj* 1. kobud, sərt, qaraqabaq, qaba; *He is somewhat gruff O, bir qədər kobuddur/qabadır;* 2. xırıltılı; *He spoke in a gruff voice O, xırıltılı səslə danışdı*

**grumble¹** [ˊgrʌmbl] *n* 1. donquldanma, gileylənmə, deyinmə, narazılıq; **to obey without a ~** dinməz-söyləməz tabe olmaq; *He is full of grumble O həmişə narazılıq edir/gileylənir;* 2. göy gurultusu, gurultu; **the ~ of distant thunder** uzaqdan gələn göy gurultusu

**grumble²** ['grʌmbl] *v* **1.** donquldanmaq, gileylənmək, narazılıq etmək; **to ~ at/ about/over** *smth.* bir şeydən narazılıq etmək; *What have you to grumble about? Nədən narazısan?/narazısınız?; He is always grumbling O həmişə narazılıq edir/ gileylənir; He grumbled at the low pay offered to him O ona təklif olunan cüzi muzddan narazılıq etdi;* **2.** guruldamaq, gurultu salmaq; *The thunder was grumbling in the distance Uzaqda göy guruldayırdı*

**grumbler** ['grʌmblə^r] *n* donquldanan / deyingən adam, daim vəziyyətindən şikayətlənən adam; **an old ~** qoca deyingən *(adam)*

**grume** [gru:m] *n tib.* qan laxtası

**grummet** ['grʌmɪt] *n dən.* kondir halqa

**grumps** [grʌmps] *n* xiffət, darıxma, qüssə, ürəyi sıxılma; pis əhvali-ruhiyyə; *She's got the grumps Onun qanı qaradır. Onun kefi korlanıb*

**grumpy** ['grʌmpɪ] *adj* hirsli, davakar, dalaşqan, tündməcaz, əsəbi

**Grundyism** ['grʌndɪɪzm] *n* şərti əxlaq normaları

**grunt¹** [grʌnt] *n* **1.** xortuldama, xoruldama, *(heyvan haq.)*; **2.** donquldanma, deyinmə, mırıldama *(insan haq.)*

**grunt²** [grʌnt] *v* **1.** xoruldamaq, xırıldamaq; **2.** donquldanmaq, deyinmək; **to ~ (out) an answer** donquldanaraq cavab vermək

**grunting-ox** ['grʌntɪŋɔks] *n (pl* **-oxen** [-ɔksn]) *zool.* yak, qaytağ, sarlıq *(Tibet öküzü)*

**gryphon** [grɪfən] *n* = **griffin**

**G-suit** ['dʒi:sju:t] *n av.* reaktiv təyyarə sürən pilotun kostyumu

**guano¹** ['gwa:nou] *n (pl* **-os** [-ouz]) zınq *(quş peyini)*

**guano²** ['gwa:nou] *v* zınqla gübrələmək

**guarantee¹** [.gærən'ti:] *n* **1.** zəmanət, təminat; **with ~ for two years** ikiillik zəmanətlə; **without ~** zəmanətsiz; **2.** girov; **to leave** *smth.* **as a ~** bir şeyi girov qoymaq; *What guarantee can you offer? Sən/Siz girov olaraq nə təklif edə bilərsən?/bilərsiniz?;* **3.** = **guaranty**; **4.** zamin, zamin olan şəxs, qarant, zəmanətçi; *Will you be my guarantee? Sən/Siz mənə zamin dura bilərsən? / bilərsiniz?; If I try to borrow £ 1000 from the bank, will you be my guarantee? Əgər mən bankdan 1000 funt borc götürməyə çalışsam, sən / siz mənə zamin ola bilərsənmi? / bilərsinizmi?;* **a ~ test** *tex.* zəmanət sınağı; **a ~ fund** zəmanətli təminat fondu

**guarantee²** [.gærən'ti:] *v* **1.** zəmanət/qarantiya vermək, zaminlik etmək; *This watch is guaranteed for 2 years Bu saata ikiillik zəmanət/qarantiya verilir; We cannot guarantee the punctual arrival of trains in foggy weather Biz dumanlı havada qatarların dəqiq/tam vaxtında gəlməsinə zəmanət verə bilmərik;* **2.** təminat /söz vermək, zamin olmaq; **to ~** *smb.'s* **debts** bir kəsin borcunun ödənilməsinə təminat vermək / zamin olmaq; *I guarantee that he will be pleased Mən onun məmnun/razı olacağına söz verirəm; We cannot guarantee our workers regular employment Biz öz fəhlələrimizi daimi işlə təmin edəcəyimizə zamin ola bilmərik; He will come, I guarantee Mən zamin oləram ki, o gələcək;* **3. (against)** sığorta etmək/etdirmək; **to ~ against fire** yanğına qarşı sığorta etmək; **to be ~d against loss** itkiyə / zərərə qarşı sığorta olunmaq

**guarantor** ['gærən'tɔ:^r] *n hüq.* zamin, zəmanət verən şəxs, qarant

**guaranty¹** ['gærəntɪ] *n hüq.* **1.** zəmanət, təminat, zaminlik, **2.** girov

**guaranty²** ['gærəntɪ] *v* = **guarantee²**

**guard¹** [ga:d] *n* **1.** mühafizə, qoruma; mühafizə / keşikçi dəstəsi; qarovul, keşikçi, konvoy; **~ of honour** fəxri qarovul; **to form a ~ of honour** fəxri qarovul düzmək; *The Duke, on his arrival, inspected the guard of honour at the station Hersoq varid olan kimi vağzalda düzülmüş fəxri qarovulu nəzərdən keçirdi;* **to mount/to change the ~** qarovulu dəyişmək; **to keep/to stand ~** növbə çəkmək, qarovulda durmaq; *The soldier was ordered to keep guard Əsgər qarovulda durmaq əmri aldı;* **to keep** *smb.* **under ~** bir kəsi dustaq/həbs etmək; **to be on ~** qarovulda olmaq; *The soldier is on guard Əsgər növbədədir;* **to set a ~ on a house** evin ətrafına mühafizə dəstəsi yerləşdirmək; **2.** növbətçi, qarovulçu, keşikçi, mühafizə əsgəri, gözətçi; **the ~ at the door** qapıda növbətçi; **3.** *pl* qvardiya; **4.** sayıqlıq, ayıqlıq, ehtiyatlılıq; ehtiyat; **to be on** *one's* **~ against** *smb.* **/** *smth.* bir kəsdən/şeydən özünü qorumaq; *Be on your guard against pickpockets Cibgirlərdən özünü/özünüzü qoru/qoruyun;* **to be on (one's) ~** növbədə / qarovulda olmaq; **to be off** *one's* **~** başısoyuqluq etmək, ehtiyatsız olmaq, hazır olmamaq; *He struck me while I was off my guard Mən zərbəyə hazır olmadığım anda o məni vurdu;* **to catch** *smb.* **off his ~** bir kəsi qəfildən tutmaq/yaxalamaq; **5.** *id.* duruş *(boksda, qılıncoynatmada);* **left-arm ~** soltərəfli duruş; **to take** *one's* **~** döyüş vəziyyəti almaq *(boksda)*; **6.** *d.y.* bələdçi, konduktor; **7.** qoruyucu *(cihaz, alət, əşya və s.)*; **fire ~** yanğınsöndürən; **~ row** *k.t.* mühafizə zolağı

**guard²** [ga:d] *v* **1.** mühafizə etmək, qorumaq, qarovul çəkmək, növbətçi olmaq; **to ~ a door** qapıda qarovul durmaq; **to ~ prisoners** məhbuslara/dustaqlara qarovul çəkmək; **to ~** *one's* **life** həyatını qorumaq; **to ~ a document** sənədi qoruyub saxlamaq; **to ~** *one's* **anonymity** öz anonimliyini / gizli adını qoruyub saxlamaq; **to ~** *smb.* **from wind and rain** bir kəsi küləkdən və yağışdan qorumaq; **2.** qorunmaq; hifz etmək; **to ~ against infection** çalışıb infeksiyadan qorunmaq; **3.** özünü saxlamaq, nəzarət / idarə etmək; **to ~** *one's* **tongue** dilini saxlamaq, artıq danışmamaq, dilinin sahibi olmaq



**guardant** ['ga:dənt] *adj arx.* mühafizə / müdafiə edən, qoruyan, keşiyində duran / dayanan

**guard-boat** ['ga:dbout] *n* növbətçi kater

**guard-house** ['ga:dhaus] *n* **1.** qarovul / keşikçi otağı, qarovulxana; **2.** qaupvaxt

**guardian** ['ga:djən] *n hüq.* qəyyum, hami, himayəçi; **to be appointed ~ to** *smb.* bir kəsə qəyyum təyin olunmaq; **natural ~, ~ by nature** əsas / əsl qəyyum *(ata və ya ana)*; **~ by statute/testamentary ~** vəsiyyət əsasında qəyyum

**guardianship** ['ga:djənʃɪp] *n hüq.* qəyyumluq, himayə; **under the ~ of the laws** qanunların himayəsi altında

**guard-rail** ['ga:dreɪl] *n* **1.** tutacaq, məhəccər, sürahi; **2.** *d.y.* istiqamətləndirici/ yönəldici rels

**guard-room** ['ga:drum] *n* = **guardhouse**

**guard-ship** ['ga:dʃɪp] *n dən.* keşikçi/növbətçi gəmi

**guardsman** ['ga:dzmən] *n (pl* **-men** [-mən]) *hərb.* **1.** keşikçi; **2.** qvardiyaçı

**gudgeon** ['gʌdʒən] *n* **I 1.** *zool.* qumlaqçı *(kiçik çay balığı)*; **2.** axmaq/maymaq/sarsaq/ sadədil adam; **3.** tələ yemi, yem *(balıq tutmaq üçün)*;

◊ **to swallow a ~** aldanmaq, tora düşmək, tovlanmaq

**gudgeon** ['gʌdʒən] *n* **II** *tex.* ox, mehvər, mil; sapfa *(oxun, yaxud valın yataqda hərlənən hissəsi)*; boyuncuq

**guerdon¹** ['gə:dən] *n şair.* mükafat, təltif

**guerdon²** ['gə:dən] *v* bəxş etmək, mükafat vermək

**guerilla** [gə'rɪlə] *n* = **guerrilla**

**guernsey** ['gə:nzɪ] *n* **1.** yun fufayka *(toxunma isti köynək)*; **2.** südlük qaramal cinsi

**guerrilla** [gə'rɪlə] *n* **1.** partizan, mücahid; **2.** partizan müharibəsi; **a ~ warfare / war** partizan müharibəsi; **a ~ warrior** partizan

**guess¹** [ges] *n* **1.** güman, zənn, fərziyyə, təxmin, ehtimal; **lucky ~** uğurlu güman; **scientific ~** elmi fərziyyə/ehtimal; **by ~** fikirləşmədən, təvəkkülü, qarasına; *What is your guess? Sənin /Sizin ehtimalın/ ehtimalınız nədir?;* **2.** təxmini hesablama; hesablanma, təxmin; **at a/by ~** təxminən, təqribən; *At a guess I should say there were 500 people present Təxminən deyərdim ki, orada 500 nəfər adam iştirak edirdi; Don't answer by guess; work the problem out Təxmini cavab vermə, problemi axıra qədər araşdır / araşdırın;*

◊ **to miss** *one's* **~** zənnində yanılmaq, səhv etmək; *This is anyone's guess Bu, kiminsə təxminidir/fərziyyəsidir; Your guess is as good as mine Elə mən də sənin kimi təxmin edirəm*

**guess²** [ges] *v* **1.** güman/fərz/zənn /təxmin etmək; anlamaq; *I can only guess the reasons for his conduct Mən onun davranışının səbəblərini yalnız təxmin edə bilərəm; I should guess him to be 50; I should guess his age at 50 Mən ona təxminən 50 yaş verərdim;* **2.** fikirləşib tapmaq, duymaq, başa düşmək, tapmaq; **to ~ a riddle** tapmacanı tapmaq; **to ~ what** *smb.* **is thinking** bir kəsin nə fikirləşdiyini duymaq; *You've guessed right/wrong Sən / siz düz / sahv tapdın / tapdınız;* **3.** *amer.* fikirləşmək, hesab / ehtimal etmək, sanmaq; *I guess it's going to rain Mən belə hesab edirəm ki, yağış yağacaq; I guess we shall see him soon Məncə, biz onu tezliklə görəcəyik;*

◊ **to keep** *smb.* **~ing** bir kəsi çaşdırmaq / karıxdırmaq

**guess-rope** ['gesroup] *n* = **guest-rope**

**guess-work** ['geswə:k] *n* **1.** özündən toxuma/uydurma, heç bir əsası olmayan güman; **2.** kor-korana görülən iş

**guest¹** [gest] *n* **1.** qonaq, mehman, müsafir; **a distinguished/honorary ~** hörmətli/fəxri qonaq; **an unbidden ~** çağırılmamış qonaq; *We're expecting a guest to dinner Biz nahara qonaq gözləyirik;* **2.** kirayənişin, sakin *(mehmanxanada)*; **paying ~** pansioner *(şəxsi pansionda otaq kirayə edən adam)*; **3.** *biol.* parazit, tüfeyli *(heyvan və bitkilərdə)*

**guest²** [gest] *v* **1.** qonaq kimi qəbul etmək; *He was royally guested Onu şahana qəbul etdilər;* **2.** qonaq olmaq / qalmaq; **to ~ at a place** bir yerdə qonaq qalmaq

**guest-card** ['gestka:d] *n* mehmanxanaya gələnlərin doldurduqları blank / vərəqə

**guest-chamber** ['gest.tʃeɪmbə^r] *n* qonaq otağı

**guest-house** ['gesthaus] *n* qonaq evi, pansion, mehmanxana

**guest-night** ['gestnaɪt] *n* ziyafət/qonaqlıq axşamı

**guest-room** ['gestrum] *n* = **guest-chamber**

**guest-rope** ['gestroup] *n* yedək / buksir ipi və ya məftili

**guff** [gʌf] *n* **1.** küləyin ani şiddəti; **2.** *amer. d.d.* boşboğazlıq, cəfəngiyyat, mənasız boş danışıq

**guffaw¹** [gʌ'fɔ:] *n* ədəbsiz qəhqəhə/qaqqıltı

**guffaw²** [gʌ'fɔ:] *v* **1.** qəhqəhə ilə gülmək, qəhqəhə çəkmək; **2.** ədəbsiz gülüşlə nəyisə demək

**guggle¹** ['gʌgl] *n* quruldama, qur-qur etmə/axma

**guggle²** ['gʌgl] *v* quruldamaq, qur-qur/luq-luq etmək, qur-qur ilə axmaq

**guichet** [.gɪ:'ʃe] *n fr.* **1.** şəbəkə; **2.** kassa pəncərəsi, bilet kassası

**guidance** ['gaɪdəns] *n* **1.** rəhbərlik, başçılıq; **under the ~ of** rəhbərliyi altında; **2.** *tex.* idarəetmə *(raketləri)*; **the ~ of the rocket's flight** raket uçuşunun idarə olunması; raketin tuşlanması;

◊ **beam-rider ~** şüa vasitəsilə mərminin yönəldilməsi

**guide¹** [gaɪd] *n* **1.** bələdçi, ekskursiya rəhbəri; **to take / to hire / to engage a ~** bələdçi tutmaq

/götürmək; 2. göstərici, oriyentir, səmt göstərən; 3. məsləhətçi; 4. nümunə, örnək; *I took him as my guide Mən onu özümə örnək hesab etmişəm;* 5. soraq / məlumat kitabçası, dərslik; **Guide to the British Museum** Britaniya Muzeyinin soraq / məlumat kitabçası; **a Guide to English Grammar** ingilis qrammatikası dərsliyi; 6. *hərb.* istiqamətləndirici alay, kəşfiyyatçı; 7. *tex.* səmtləndirici detal/hissə *(maşında, mexanizmdə);* 8. nişan; **~ signs** yol nişanları *(yol hərəkəti üçün)*

**guide²** [gaɪd] *v* 1. bələdçi olmaq, bələdçilik etmək; **to ~ *smb.* to the station** bir kəsə vağzala qədər bələdçi olmaq; *The blind man was guided by his dog Kor adama onun iti bələdçilik edirdi;* 2. rəhbərlik / başçılıq etmək, yönəltmək; **to ~ *smb.* in his studies** bir kəsin dərslərinə rəhbərlik etmək; 3. rəhbər olmaq, idarə etmək; **to ~ the state** dövləti idarə etmək; 4. təminat/göstəriş/nəsihət etmək, düz yola çağırmaq; *I shall be guided by your advice Mən sənin/sizin məsləhətinlə/məsləhətinizlə hərəkət edəcəm;* **to be ~d by *one's* sense of duty** vəzifə hissini rəhbər tutmaq, öz vəzifə hissinə görə hərəkət etmək; *You must be guided by your sense of what is right and just Sən / Siz nəyin düz və ədalətli olduğunu müəyyən etmək üçün öz düşüncəni/düşüncənizi rəhbər tutmalısan / tutmalısınız;* 5. göstərici olmaq; *The lights in the harbour guided the ship to port Limandakı işıqlar gəminin limana daxil olmasına yol göstərirdi*

**guide-board** [ˈgaɪdbɔ:d] *n* yolgöstərici işarə / lövhə

**guide-book** [ˈgaɪdbuk] *n* soraq / məlumat kitabçası

**guided** [ˈgaɪdɪd] *adj* idarəolunan; **~ missile** idarəolunan raket

**guide-dog** [ˈgaɪddɔg] *n* bələdçi it *(korları gəzdirən)*

**guideless** [ˈgaɪdlɪs] *adj* idarəolunmayan; özbaşına, özü istədiyini edən

**guided-missile** [ˈgaɪdɪdˈmɪsaɪl] *n* idarə olunan raket

**guideline** [ˈgaɪdlaɪn] *n siya.* direktiv, göstəriş, əmr

**guidemark** [ˈgaɪdma:k] *n* qeyd etmə, işarə, qeyd, nişanlama

**guide-post** [ˈgaɪdpoust] *n* göstərici dirək *(yol ayrıcında)*

**guide-rope** [ˈgaɪdroup] *n av.* qaydrop, kanat, ip, kəndir *(aerostat endiyi zaman yerə atılan)*

**guidon** [ˈgaɪdən] *n hərb.* bayraq, kiçik bayraq

**guild** [gɪld] *n* 1. gildiya *(orta əsrlərdə Qərbi Avropada tacirlər və ya sənətkarlar ittifaqı);* **the ~ of merchants** tacirlər gildiyası; 2. təşkilat, ittifaq, birlik; **a ~ of bank clerks** bank məmurları birliyi / ittifaqı

**guild-brother** [ˈgɪld.brʌðə] *n* gildiyanın və ya birliyin üzvü

**Guild-hall** [ˈgɪld.hɔ:l] *n* **(the ~)** ratuşa, London şəhər bələdiyyələrinin banket / rəsmi qəbul salonu

**guile¹** [gaɪl] *n* yalan, xainlik, namərdlik, hiylə, vəfasızlıq; **a man full of ~** namərd / xain /hiyləgər/məkrli adam; **to get *smth.* by ~** bir şeyi hiylə ilə əldə etmək

**guile²** [gaɪl] *v arx.* aldatmaq, kələk gəlmək

**guileful** [ˈgaɪlfl] *adj* xain, namərd, hiyləgər

**guileless** [ˈgaɪllɪs] *adj* sadəlövh, sadə, ürəyiaçıq, səmimi; **~ look** sadə görünüş, məsum görkəm; **~ smile** səmimi təbəssüm

**guillemot** [ˈgɪlɪmɔt] *n zool.* kayra *(Şimal dəniz quşu)*

**guillotine¹** [.gɪləˈti:n] *n* 1. gilyotin *(Fransada başkəsən cəza maşını);* 2. gilyotin *(badamcıqları və qırtlaqdakı artmaları cərrahiyyə yolu ilə kənar etmək üçün tibb aləti);* 3. parlamentdə səsvermə müddətinin əvvəlcədən müəyyən edilməsi; sərt reqlament; *The guillotine fell Səsvermə vaxtı /müddəti haqqında qərar qəbul olundu*

**guillotine²** [.gɪləˈti:n] *v* 1. gilyotinləmək, gilyotinlə baş kəsmək/boyun vurmaq; 2. kəsmək *(kitabı və s.);* 3. parlamentdə əvvəlcədən səsvermə müddətini müəyyən etmək

**guilt** [gɪlt] *n* 1. təqsir, günah, suç, günahkarlıq, təqsirkarlıq, suçluluq; *The guilt of the accused man was in doubt Ittiham olunan şəxsin təqsirkar olması şübhəli idi;* **without ~** günahsız, təqsirsiz, suçsuz; **to suffer from ~** günahını anlayaraq əzab çəkmək; 2. *arx.* xəta, qəbahət, yaramaz/ nalayiq hərəkət; 3. cəzaya layiqlik

**guiltily** [ˈgɪltɪlɪ] *adv* günahkar-günahkar, günahkarcasına, günahkar halda; **to smile ~** günahkarcasına gülümsəmək

**guiltiness** [ˈgɪltɪnɪs] *n* müqəssirlik, suçluluq, təqsirlilik, günahkarlıq, təqsirkarlıq; cəzaya layiqlik

**guiltless** [ˈgɪltlɪs] *adj* 1. günahsız, təqsirsiz, suçsuz; 2. **(of)** *d.d.* bilməyən, xəbərsiz; **~ of Greek** yunan dilindən xəbərsiz; **~ of soap** sabundan xəbərsiz

**guilty** [ˈgɪltɪ] *adj* günahkar, müqəssir, təqsirli, suçlu; **a ~ person** günahkar/müqəssir /suçlu şəxs; **the ~ party** *hüq.* müqəssir tərəf; **to be ~ of murder** qətldə müqəssir /suçlu olmaq; **to find *smb.* ~** *hüq.* bir kəsi müqəssir hesab etmək; **to plead ~** *hüq.* özünü müqəssir hesab etmək; **not to plead ~** *hüq.* özünü müqəssir hesab etməmək; **~ looks** günahkar/suçlu baxışlar

**guinea-fowl** [ˈgɪnɪfaul] *n* firəngtoyuğu

**guinea-pig** [ˈgɪnɪpɪg] *n* 1. *zool.* hind donuzu; 2. üzərində elmi təcrübə aparılan insan; 3. kompaniya direktoru, ruhani, həkim və s. *(zaraf. əməkhaqqları qızıl sikkə ilə hesablanan şəxslər)*

**guinea-squash** [ˈgɪnɪ.skwɔʃ] *n bot.* badımcan

**guinea-worm** [ˈgɪnɪwə:m] *n* 1. *zool.* rişta *(girdə parazit qurd, Qvineya qurdu);* 2. drakunkulyoz *(riştanın törətdiyi xəstəlik)*

**guise** [gaɪz] *n* 1. sifət, cild, maska; **under/ in the ~ of friendship** dost maskası altında, yalandan özünü dost kimi göstərməklə; 2. zahiri görünüş, görünüş, görkəm; 3. *arx.* libas, qiyafə; **in the ~ of a monk** rahibə qiyafəsində / libasında



**guitar¹** [gɪˈta:ʳ] *n* gitara; **to play the ~** gitarada çalmaq

**guitar²** [gɪˈta:ʳ] *v* gitara çalmaq

**gulch¹** [gʌlʃ] *n amer.* dərin və dar qayalıq dərə

**gulch²** [gʌlʃ] *v d.d.* tıxmaq, içəri ötürmək *(yemək mənasında)*

**gulden** [ˈgʌldn] *n* qulden *(Hollandiyada pul vahidi)*

**gules¹** [gju:lz] *n şair.* qırmızı rəng

**gules²** [gju:lz] *adj şair.* qırmızı

**gulf¹** [gʌlf] *n* 1. körfəz, buxta *(kiçik körfəz);* **the Gulf of Mexico** Meksika körfəzi; 2. uçurum; 3. girdab, burulğan, dərya, dərinlik *(həm. məc);* **a fiery ~, a ~ of fire** alov burulğanı; **a deep/ fathomless / wide ~** dərin/sonsuz/geniş uçurum; 4. qurd/canavar iştahası; 5. *d.d.* adi diplom; **to get a ~** güclə universiteti bitirib adi diplom almaq; 6. böyük filiz yatağı

**gulf²** [gʌlf] *v* 1. hopdurmaq, canına çəkdirmək; 2. *d.d.* adi diplom vermək; 3. *d.d.* girdaba salmaq/düşmək

**Gulf-stream** [ˈgʌlf stri:m] *n* Qolfstrim *(Atlantik okeanından gələn ılıq cərəyan)*

**gull¹** [gʌl] *n* I *zool.* qağayı

**gull** [gʌl] *n* II 1. sadəlövh/sarsaq, gicbəsər / səfeh adam; 2. *d.d.* yalançı, hiyləgər, kələkbaz, haramzadə, cüvəllağı *(adam)*

**gull²** [gʌl] *v* aldatmaq, ələ salmaq, araya qoymaq; *He gulled him out of his money O aldadıb onun pulunu aldı*

**gull-catcher** [ˈgʌl.kætʃəʳ] *n* yalançı, fırıldaqçı *(adam)*

**gullet** [ˈgʌlɪt] *n* 1. qida borusu; 2. udlaq, hülqum

**gullibility** [.gʌlɪˈbɪlɪtɪ] *n* sadəlövhlük, sadədillik, hər şeyə inanma

**gullible** [ˈgʌləbl] *adj* sadəlövh, sadədil, hər şeyə inanan

**gully¹** [ˈgʌlɪ] *n* I 1. yağış suyunun açdığı yarğan /çuxur/qobu; 2. yağış suyunun axması üçün açılan kanal/arx/boru; 3. novşəkilli rels; **~ control** torpağın yuyulub aparılmasına qarşı mübarizə; **~ erosion** yarğan eroziyası

**gully** [ˈgʌlɪ] *n* II böyük bıçaq

**gully²** [ˈgʌlɪ] *v* xəndək açmaq, xəndək əmələ gətirmək, kanal / arx açmaq

**gully-raker** [ˈgʌlɪ.reɪkəʳ] *n* azmış mal-qara oğrusu

**gulp¹** [gʌlp] *n* 1. qurtum; **at one ~** bir qurtuma /nəfəsə; 2. udma, udqunma

**gulp²** [gʌlp] *v* 1. **(down)** udmaq, tələm-tələsik udmaq; **to ~ (down) a glass of water** bir stəkan suyu tələm-tələsik içmək; 2. saxlamaq, boğmaq *(həyəcanı, göz yaşını və s.);* **to ~ down sobs** hönkürtünü sıxmaq/saxlamaq/gizlətmək; 3. sözləri yemək *(aydın danışmamaq);* 4. hər şeyə kor-koranə inanmaq; **to ~ down a sensational story** ağzı açılı halda həyəcan doğuran əhvalata qulaq asmaq

**gum¹** [gʌm] *n* I 1. diş əti, diş ətinin kənarı; 2. *d.d.* çənə; *The dog bared its gums at me It ağzını geniş açıb dişlərini mənə ağartdı*

**gum** [gʌm] *n* II 1. kitrə; 2. qatran, qatran ifrazı; 3. yapışqan; 4. *pl* qaloş; 5. gözün küncündə / ucunda ifraz olunan yapışqan çirk; 6. = **chewing-gum**

**gum²** [gʌm] *v* 1. yapışdırmaq; *(həm də* **to ~ down /in/up/together***); He gummed two sheets of paper together O, iki vərəq kağızını bir-birinə yapışdırdı; He gummed down the flap of the envelope O, zərfin ağzını yapışdırdı;* 2. kitrə / qatran ifraz etmək; 3. *amer.* aldatmaq, çaşdırmaq; 4. *tex.* ilişmək, sıxmaq;

◊ *By gum! jarq. Aman Allah!*

**gumbo** [ˈgʌmbou] *n* 1. *(pl* **-os** [-ouz]) *bot.* bamiya, okra *(qabıqlı bitki);* 2. okra şorbası

**gumboil** [ˈgʌmbɔɪl] *n* flus *(diş ətinin iltihabı)*

**gum-boots** [ˈgʌmbu:ts] *n pl* rezin çəkmə / sapoq

**gum-elastic** [ˈgʌmɪˈlæstɪk] *n* rezin, kauçuk

**gummy** [ˈgʌmɪ] *adj* I 1. yapışan, yapışqan; **~ chestnut buds** yapışqan şabalıd tumurcuqları; 2. qatranlı, kitrəli; 3. şişmiş; **a ~ leg** şişmiş qıç

**gummy** [ˈgʌmɪ] *adj* II *tib.* qummoz

**gumption** [ˈgʌmpʃn] *n d.d.* 1. fərasət, fəhm, dərrakə, gözüaçıqlıq, zirəklik; *The boy lacks gumption Oğlanın fərasəti yoxdur;* 2. əridici, həlledici *(boya üçün)*

**gumptious** [ˈgʌmpʃəs] *adj d.d.* zirək, diribaş, hazırcavab, gözüaçıq, fəhmli

**gumshoe¹** [ˈgʌmʃu:] *n amer. d.d.* 1. qaloş; 2. *pl* ket; 3. *jarq.* xəfiyyə

**gumshoe²** [ˈgʌmʃu:] *adj d.d.* gizli, xəlvəti, əlaltından iş görən/fəaliyyət göstərən; **~ campaign** gizli kampaniya

**gumshoe³** [ˈgʌmʃu:] *v d.d.* gizlincə/xəlvəti yaxınlaşmaq/keçmək

**gum-tree** [ˈgʌmtrɪ:] *n bot.* evkalipt ağacı;

◊ **to be up a ~** çıxılmaz vəziyyətdə olmaq; *He has seen his last gum-tree Onun sonu çatıb, Onun işi bitib*

**gun¹** [gʌn] *n* 1. top; **a highpower ~** uzaqvuran top; **the report of a ~** atəş səsi, top atəşi; **~ of position** *hərb.* ağır səhra topu; **to charge a ~** topu doldurmaq; **to fire a ~** topdan atəş açmaq; 2. odlu silah, tüfəng, karabin; **a double-barrelled ~** qoşalülə tüfəng; **a sporting ~** ov tüfəngi; **a starting ~** start tapançası; 3. *amer.* tapança, pişto; 4. pulemyot; 5. yaylım atəşi, salyut, salam atəşi; 6. *d.d.* ovçu, atıcı, topçu; 7. *jarq.* oğru, xırsız; 8. *domna peçinin gözünə tıxmaq üçün istifadə olunan top*; 9. yağ şprisi *(həm də* **grease-~***);*

◊ **a big/a great ~** iddialı adam, hörmətli zat, "böyük adam"; *Great guns! Əcəb işdir!, Lənətə gələsən!; Son of a gun! Fırıldaqçı!, Əclaf!:* **as sure as a ~** gün kimi aydın, şübhəsiz; **to fire off a ~** ciddi irad tutmaq, güllə kimi açılmaq; **to strike *smb.'s* ~** bir kəsin planını pozmaq; to

**stand/to stick to** ***one's*** **~** mövqeyini əldən verməmək, möhkəm dayanmaq

**gun**[2] [gʌn] *v* (**-nn-**) **1.** atəş açmaq *(topdan)*; **2.** vuruşmaq, müharibə etmək; **3.** *d.d.* vurmaq *(tüfənglə)*; **to ~** ***smb.*** **down** vurub öldürmək *(tüfənglə)*; **4.** ov etmək; **to go to ~ning** ova getmək/çıxmaq

**gunboat** [ˈgʌnbout] *n* **1.** kononerka *(orta kalibrli topları olan itigedən sahil keşikçi gəmisi)*; **2.** *amer.d.d.* dəniz donanması

**gun-butt** [ˈgʌnbʌt] *n* qundaq *(tüfəngdə)*

**gun-carriage** [ˈgʌn.kærɪdʒ] *n hərb.* top qundağı / altlığı

**gun-cotton** [ˈgʌnkɔtən] *n hərb.* piroksilin *(partlayıcı maddə)*

**gun-crew** [ˈgʌnkru:] *n hərb.* qrup, dəstə *(topa qulluq edən əsgər qrupu)*

**gun-fire** [ˈgʌnfaɪə$^{r}$] *n* **1.** artilleriya atəşi; **2.** *səhərin açılmasını və günün batmasını bildirmək üçün sadəcə barıtla atəş açan top*

**gun-layer** [ˈgʌn.leɪə$^{r}$] *n hərb.* tuşlayıcı *(topda)*

**gun-lock** [ˈgʌnˈlɔk] *n* tüfəng sürgüsü

**gunmaker** [ˈgʌn.meɪkə$^{r}$] *n* silah ustası

**gunman** [ˈgʌnmən] *n (pl* **-men** [-mən]) **1.** *amer.* silahlı bandit, soyğunçu, cani, qatil; **2.** silah ustası; **3.** silahlı adam

**gunner** [ˈgʌnə$^{r}$] *n* **1.** topçu, artillerist, pulemyotçu; **2.** ovçu; **3.** artilleriya qoşqu atı

**gunner's cockpit** [ˈgʌnəzˈkɔkpɪt] *n av.* atıcı pulemyotçunun kabinəsi

**gunnery** [ˈgʌnərɪ] *n* **1.** artilleriya/topçuluq işi; **2.** artilleriya / top atəşi; **3.** atəşaçma *(ovda)*; **4.** artilleriya

**gunning** [ˈgʌnɪŋ] *n* **1.** silahla ov etmə; **2.** *arx.* artilleriya atəşi

**gunny** [ˈgʌnɪ] *n* **1.** qaba/cod parça; ağ qalın kətan parça; **2.** cod parçadan tikilmiş kisə

**gunpowder** [ˈgʌn.paudə$^{r}$] *n* qara barıt; **white / smokeless ~** ağ / tüstüsüz barıt

**gun-runner** [ˈgʌn.rʌnə$^{r}$] *n d.d.* silah qaçaqmalçısı

**gun-running** [ˈgʌn.rʌnɪŋ] *n* silah qaçaqmalçılığı

**gunshot** [ˈgʌnʃɔt] *n hərb.* atəş mənzili/məsafəsi; **within ~** atəş məsafəsi hüdudunda; **out of ~** atəş mənzili hüdudundan kənarda

**gun-shy** [ˈgʌnʃaɪ] *n* hürküdücü atəş *(ov itlərini və artilleriya atlarını hürkütmək üçün açılan)*

**gunsmith** [ˈgʌnsmɪθ] *n* silah ustası

**gun-stick** [ˈgʌnstɪk] *n* sünbə

**gun-stock** [ˈgʌnstɔk] *n* tüfəng qundağı

**gunwale** [gʌnl] *n dən.* planşir *(gəmi göyərtəsinin kənarlarında hasar kimi qoyulan tir)*

**gurgitation** [.gə:dʒɪˈteɪʃn] *n* ləpələnmə, luq-luq etmə *(su qaynayan zaman)*

**gurgle**[1] [ˈgə:gl] *n* suyun luq-luq etməsi; şırıldama, qur-qur etmə, axma; **a ~ of gargling** boğazın qarqara edilməsi zamanı çıxan qur-qur səs; **a ~ of water among stones** daşların arasından axan suyun şırıltısı

**gurgle**[2] [ˈgə:gl] *v* **1.** qur-qur/luq-luq etmək, qığıldamaq; şırıltı ilə axmaq; *The baby gurgled with pleasure Körpə məmnunluqla qığıldadı;* **2.** *arx.* qarqara etmək

**guru** [ˈguru:] *n* quru *(Hindistanda ruhani rəhbər / müəllim)*

**gush**[1] [gʌʃ] *n* **1.** leysan, şiddətli/güclü/gözlənilməz axın/fontan/fəvvarə; **a ~ of blood** qan fontanı; **a ~ of oil** neft fontanı; *Tears came out with a gush Göz yaşları leysan kimi axmağa başladı;* **2.** izhar etmə, söz seli/axını; şiddətli arzu; coşma, ani şiddət *(həm də məc.)*; **a ~ of wind** küləyin ani şiddəti; **a ~ of enthusiasm** coşub-daşan şövq, böyük həvəs

**gush**[2] [gʌʃ] *v* **1.** şırıltı ilə tökülmək / axmaq, sel kimi axmaq; fışqırmaq *(həm də* **to ~ down /in/ forth/out/up**); *The water gushed out from the rock Su qayadan fışqıraraq şırıltı ilə axırdı; She gushed into tears O, göz yaşı tökdü; The wound gushed out a crimson blood Yaradan al qan fışqırdı;* **2.** fontan vurmaq; *Oil gushed from the new well Yeni quyudan neft fontan vurdu;* **3.** boşboğazlıq/naqqallıq etmək; *They gushed over film stars Onlar kino ulduzları haqqında uzun-uzadı danışdılar*

**gusher** [ˈgʌʃə$^{r}$] *n* **1.** *d.d.* uzun-uzadı öz hiss və duyğularını izhar edən şəxs, naqqal; **2.** *geol.* güclü neft fontanı; **3.** fontan vuran neft quyusu

**gusset** [ˈgʌsɪt] *n* **1.** xiştək *(paltarda)*; **2.** qoltuqaltı *(kişi köynəyində)*; **3.** *k.t.* üçbucaq əkin sahəsi; **4.** *tex.* künc birləşməsi, küncdə birləşən yer, künc ləməsi

**gust**[1] [gʌst] *n* **1.** küləyin/yağışın/dolunun/ yanğının ani şiddəti; qasırğa; *The wind was blowing in gusts Külək arabir şiddətlənirdi*; **the stormy ~s of a winter day** qış günündə qasırğanın ani şiddəti; **a ~ of fire** yanğının şiddəti; **~s of smoke** tüstü burumları; **2.** cuşa gəlmə, coşma; hiddət, hiddətlənmə; partlama; **a ~ of rage** coşub özündən çıxma; **a ~ of passions** ehtirasın aşıb-coşması

**gust**[2] [gʌst] *v* dadmaq, dadına baxmaq, dadını görmək/bilmək

**gustable** [ˈgʌstəbl] *adj* **1.** dadlı, yeməli, iştahaaçan; **2.** dadverən, xoştəm, təmli

**gustation** [gʌsˈteɪʃn] *n* dadını yoxlama, dadına baxma

**gustatory** [ˈgʌstətərɪ] *adj* dadverən, təmli, xoştəm; dad, təm; **~ nerve** *anat.* dad siniri

**gusto** [ˈgʌstou] *n (pl* **-os** [-ouz]) **1.** məmnuniyyət, kef; **to do** ***smth.*** **with ~** bir işi məmnuniyyətlə etmək; **2.** zövq, nəşə; **3.** qızğınlıq, həvəs, coşğunluq, ehtiras; **to read a poem with too much ~** böyük coşğunluqla / ehtirasla şer oxumaq

**gusty** [ˈgʌstɪ] *adj* **1.** küləkli; **a ~ day** küləkli gün; **~ weather** küləkli hava; **2.** *məc.* gur, coşğun, gurultulu; **~ mirth** gur şənlik / əyləncə

**gut**[1] [gʌt] *n anat.* **1.** bağırsaq, həzm kanalı; **blind ~ 1)** kor bağırsaq; **2)** *məc.* çıxılmaz / çətin vəziyyət, çıxmaz; **large ~s** yoğun bağırsaq; **little/ small ~s** nazik bağırsaq; **2.** *d.d.* içalat, iç; **a pain in the ~s** qarında ağrı; **3.** göbək, yekə qarın; *He stuck the bayonet into his guts O, süngünü onun qarnına soxdu;* **to run** ***smb.*** **through the ~s** bir kəsin qarnını yırtmaq/bağırsaqlarını bayıra tökmək; **4.** bağırsaq köşəsi, kiriş, tel; ketqut, sap *(qoyun və ya keçi bağırsağından hazırlanmış təbabətdə işlədilən sap)*; **5.** *pl d.d.* məzmun, məna, məğz, can; *His speech has no guts in it Onun nitqində bir məna yoxdur; He has no guts in him O, çox vecsiz/lüzumsuz adamdır, O, bir qara qəpiyə belə dəyməz; The real guts of his speech is... Onun nitqinin canı budur ki...;* **6.** *pl d.d.* mərdlik, səbat, mətanət, cəsarət, dözüm, səbr, iradə; **a man with plenty of ~s** çox iradəli adam; **to have the ~ to do / to say** ***smth.*** bir şey etməyə/deməyə cəsarət etmək; *He has left half his guts behind him O, ruhdan düşüb, O ruhən sarsılıb;* **6.** dar keçid, boğaz, arx, kanal; **the Gut of Gibraltar** *tar.* Cəbəllütariq boğazı;
◊ **to hate** ***smb.'s*** **~s** bir kəsdən zəhləsi getmək; **to tear the ~s out** qanını sormaq, üzmək, istismar etmək, üzüb əldən salmaq

**gut**[2] [gʌt] *v* **1.** içalatını təmizləmək *(balığın, quşun və s.)*; **2.** viran / bərbad etmək, xaraba qoymaq, dağıtmaq; soymaq, qarət etmək, talamaq; *A mob gutted the house Bir qrup adam evi çapıb taladı; The room was completely gutted by the fire Otaq oddan tamamilə yandı;* **3.** mənimsəmək, qavramaq, yaxşı yadda saxlamaq; **to ~ a book** kitabın məzmununu mənimsəmək; **4.** *d.d.* acgözlüklə yemək, tıxmaq, içəri ötürmək

**gutter**[1] [ˈgʌtə$^{r}$] *n* **1.** nov, novalça; **2.** çirkab/ yağış sularının axması üçün arx/kanal; qurutma kanalı; **3.** yoxsullar yaşayan məhəllə, xarabalıq; **the language of the ~** kobud/loru dil; **to rise from the ~** yoxsul təbəqədən çıxmaq; **to be born in the ~** yoxsulluq içində doğulmaq; **to take a child out of the ~** sahibsiz uşağa yiyə durmaq, uşağı yoxsulluqdan xilas etmək / qurtarmaq

**gutter**[2] [ˈgʌtə$^{r}$] *v* **1.** ərimək, əriyib axmaq *(şam haq.)*; **2.** nov/novalça qoymaq; nov/ novalça düzəltmək; **3.** axmaq, tökülmək; *Tears gutter down Göz yaşları axır*

**gutter-bird** [ˈgʌtəbə:d] *n* **1.** sərçə; **2.** şübhəli ad çıxarmış adam

**gutter-child** [ˈgʌtətʃaɪld] *n (pl* **-children** [-.tʃɪldrən]) sahibsiz uşaq

**gutter-man** [ˈgʌtəmən] *n* **1.** küçə alverçisi; **2.** çərçi, səyyar satıcı; **3.** su arxlarını və qanovları təmizləyən işçi / fəhlə

**gutter-plough** [ˈgʌtə.plau] *n* qanovqazan kotan

**gutter-snipe** [ˈgʌtəsnaɪp] *n* **1.** sahibsiz uşaq, küçə uşağı; **2.** *amer. d.d.* birjada qeydiyyatdan keçməmiş dəllal

**guttler**[1] [ˈgʌtlə$^{r}$] *n d.d.* qarınqulu

**guttler**[2] [ˈgʌtlə$^{r}$] *v d.d.* acgözlüklə yemək, içəri ötürmək

**guttural** [ˈgʌtərəl] *adj* qırtlaq, boğaz; **the ~ orifice** qırtlaq yolu

**guy**[1] [gaɪ] *n* I **1.** uyuq, qorxuluq, müqəvva; **to be dressed up like a ~** uyuq/müqəvva kimi geyindirilmək; **2.** gülməli geyinmiş adam; **regular ~** əsl müqəvva; **3.** *amer. d.d.* oğlan, gənc, cavan; **regular ~** çox yaxşı oğlan; **wise ~** ağıllı oğlan/gənc

**guy** [gaɪ] *n* II *dən.* buraz, kanat *(gəmidə)*

**guy**[2] [gaɪ] *v* I *d.d.* gülünc vəziyyətə salmaq, oyuncaq yerinə qoymaq, ələ salmaq

**guy** [gaɪ] *v* II *dən.* burazla/kanatla bərkitmək;
◊ **to do a ~** yox olmaq, qaçıb qurtarmaq; **to give the ~ to** ***smb.*** sivişib bir kəsin əlindən çıxmaq, əkilmək, yayınmaq

**guzzle**[1] [ˈgʌzl] *n* **1.** *d.d.* spirtli içki; **2.** *d.d.* içki məclisi; **3.** qarınquluthe luq

**guzzle**[2] [ˈgʌzl] *v* **1.** *d.d.* acgözlüklə yemək və ya içmək; sərxoşluq etmək; **to sit guzzling beer all day** bütün günü oturub pivə içmək; *It annoyed me to see him guzzle roast beef and mustard Onun əti xardalla necə acgözlüklə yeməyi məni əsəbiləşdirdi;* **2.** pulu içkiyə xərcləmək, əyyaşlıq etmək

**guzzler** [ˈgʌzlə$^{r}$] *n d.d.* **1.** əyyaş, içki düşkünü; **2.** qarınqulu, acgöz adam

**gyle** [gaɪl] *n* **1.** qıcqırmış üzüm şirəsi; **2.** üzüm şirəsini qıcqırtmaq üçün çən

**gym** [dʒɪm] *n d.d.* **gymnazium** *və* **gymnastics** *sözlərinin qısa forması*

**gymnasium** [dʒɪmˈneɪzɪəm] *n* I *(pl* **~s** *həm.* **-sia** [.zjə]) gimnastika zalı; **~ shoes** idman ayaqqabısı; **~ team** gimnastika komandası

**gymnasium** [dʒɪmˈneɪzɪəm] *n* II gimnaziya

**gymnast** [ˈdʒɪmnæst] *n* gimnast

**gymnastic**[1] [dʒɪmˈnæstɪk] *n* **1.= gymnastics**; **2.** məşq, təlim; əqli təmrin; *The study of logic is a mental gymnastic Məntiq elmi ilə məşğul olma yaxşı əqli təmrindir*

**gymnastic**[2] [dʒɪmˈnæstɪk] *adj* **1.** gimnastik; **2.** əqli təmrinə aid, zehni/hafizəni möhkəmləndirən *(məşq, təmrin haq.)*

**gymnastical** [dʒɪmˈnæstɪkəl] *adj* = **gymnastic**[2]

**gymnastics** [dʒɪmˈnæstɪks] *n* gimnastika; **hygienic ~** gigiyenik gimnastika; **industrial ~** istehsalat gimnastikası; **remedial ~** müalicə gimnastikası

**gynaecological** [.gaɪnɪkəˈlɔdʒɪkəl] *adj* ginekoloji

**gynaecologist** [.gaɪnɪˈkɔlədʒɪst] *n* ginekoloq

**gynaecology** [.gaɪnɪˈkɔlədʒɪ] *n* ginekologiya

**gyp**[1] [dʒɪp] *n* I xidmətçi *(Kembric və Darem universitetlərində)*

**gyp** [dʒɪp] *n* II **1.** *amer. d.d.* fırıldaq, kələkbazlıq, dələduzluq; **2.** fırıldaqçı, dələduz, kələkbaz, xəspuş, lotu

**gyp** [dʒɪp] *n* III *d.d.* cəza, tənbeh; **to give** ***smb.*** **~** bir kəsi cəzalandırmaq/döymək, canını almaq

**gyp** [dʒɪp] *n* IV *amer.* qancıq

**gyp**[2] [dʒɪp] *v amer. d.d.* **1.** fırıldaqçılıq / dələduzluq / lotuluq etmək, adam aldatmaq; **2.** oğurluq etmək

**Gyppo** ['dʒaɪpou] *n* (*pl* **-os** [-ouz]) *d.d.* misirli
**gyps** [dʒɪps] *n, v* = **gypsum**[1,2]
**gypsa** ['dʒɪpsə] *n* = *pl* **gypsum**
**gypsiferous** [dʒɪp'sɪfərəs] *adj* gipsli, gipsi olan
**gypsum** ['dʒɪpsəm] *v* torpağa gips vermək, gipslə gübrələmək, gipsləmək *(torpağı)*
**Gypsy** ['dʒɪpsɪ] *n* = **Gipsy**
**gypsy moth** ['dʒɪpsɪmɔθ] *n* ipək/barama qurdu
**gyrate**[1] ['dʒaɪərɪt] *adj* spiralşəkilli/spiralvari burulmuş
**gyrate**[2] [dʒaɪə'reɪt] *v* dairəvi/spiralşəkilli/spiralvari fırlanmaq
**gyration** [ˌdʒaɪə'reɪʃn] *n* **1.** dairəvi hərəkət; **2.** dövr etmə, dövr
**gyratory** ['dʒaɪərətərɪ] *adj* fırlanan, hərlənən, dolanan; ~ **breaker** *tex.* konus formalı daşdoğrayan maşın; ~ **screen** *tex.* fırlanan şadara
**gyre** [dʒaɪə'] *n* **1.** *şair.* dövri hərəkət, dairəvi hərəkət; **2.** dairə, halqa, çənbər, üzük, çevrə; **3.** spiral
**gyrocompass** ['dʒaɪərɪ'kʌmpəs] *n* girokompas *(maqnit əqrəbi əvəzinə kiroskopu olan kompas)*
**gyropilot** ['dʒaɪərəˌpaɪlət] *n av.* avtopilot
**gyroplane** ['dʒaɪərəpleɪn] *n av.* avtojir *(havadan ağır uçucu aparat)*
**gyroscope** ['gaɪərəskoup] *n* jiroskop *(hər cür vəziyyətdə öz sabitliyini mühafizə edən sərbəst oxlu cihaz)*
**gyroscopic** [gaɪərəs'kɔpɪk] *adj* jiroskopik
**gyrostat** ['dʒaɪəroustæt] *n* jirostat
**gyrus** ['dʒaɪrəs] *n* (*pl* **-ri**) *anat.* beyin qırışığı
**gyve**[1] [dʒaɪv] *n şair.* qandal, buxov, əsarət zənciri
**gyve**[2] [dʒaɪv] *v şair.* qandallamaq, buxovlamaq, buxov vurmaq, zəncirləmək, bağlamaq



# Hh

**H h** [eɪtʃ] *n* (*pl* **H's, h's** ['eɪtʃɪz]) *ingilis əlifbasının 8-ci hərfi;* **to drop** *one's* **h's** h-in lazım olan yerdə tələffüz olunmaması *(London loru dilinə xas olan xüsusiyyət)*
**ha** [hɑ:] *inter* aa!, aha!, vay! *(təəccüb, qəzəb, sevinc bildirən nida)*; ha ha, ha-ha, ha-hum, hm, aha-aha *(lazımi bir söz yada düşməyəndə)*
**habeas corpus** ['heɪbjəs'kɔ:pəs] *n lat.* **Habeas Corpus Act** Habies Korpus *(şəxsiyyətin toxunulmazlığı haqqında 1679-cu ildə qəbul olunmuş qanun)*; **1.: writ of ~** *həbs olunmuş şəxsin azad olunması haqqında sərəncam;* **2.** *həbs olunmuş şəxsin məhkəməyə verilməsi və onun həbsinin qanuniliyinə baxılması haqqında hakimin göstərişi*
**haberdasher** ['hæbədæʃə'] *n* **1.** qalantereya malları satan, xırdavatçı; **2.** kişi alt paltarı satan
**haberdashery** ['hæbədæʃərɪ] *n* **1.** xərəziyyat, xırdavat, qalantereya malları; **2.** qalantereya dükanı/mağazası; **3.** kişi alt paltarı, tuman-köynək
**habergeon** ['hæbədʒn] *n* qolsuz dəmir geyim, zireh
**habile** ['hæbɪl] *adj* məharətli, mahir, qabil, bacarıqlı
**habiliments** [hæ'bɪlɪmənts] *n* **1.** *pl* geyim, libas; **2.** don, kostyum; **3.** geyim əşyası
**habilitate** [hə'bɪlɪteɪt] *v* **1.** müəyyən bir fəaliyyət göstərmək üçün hazırlaşmaq *(müəllimlik, həkimlik və s.)*; **2.** geyindirmək; **3.** şaxtanı maliyyələşdirmək, şaxtanı avadanlıqla təmin etmək
**habilitation** [həˌbɪlɪ'teɪʃn] *n* müəyyən bir sahədə fəaliyyət göstərməyə hazırlaşma
**habit**[1] ['hæbɪt] *n* I **1.** adət, vərdiş, rəsm, qayda; **to form/to acquire/to assume/to get a ~** *(of doing smth.)* adət etmək *(bir şeyi etməyə)*; *Don't let him get you into the habit of taking drugs İmkan vermə / verməyin ki, o səni/sizi narkotik maddələr qəbul etməyə alışdırsın;* **to be in the ~ of doing** *smth.* bir şeyi etmək vərdişi/şakəri olmaq; *It is a habit with him to keep early hours Tez yatmaq və erkən durmaq onun adətidir;* **to fall / to get into bad ~s** pis/axmaq vərdiş qazanmaq; *Don't let yourself get into bad habits Axmaq vərdişlər qazanmağı özünə rəva bilmə;* **to fall / to get out of the ~ of** əl çəkmək, atmaq *(vərdiş haq.)*; *He fell out of the habit of swearing / smoking O, söyüş söymək-/papiros çəkmək vərdişindən əl çəkdi;* **to do** *smth.* **by/from force of ~** bir şeyi vərdiş/adət etdiyinə görə etmək; **to break (off) a ~** adəti/vərdişi tərgitmək, adətdən/vərdişdən əl çəkmək; **~ and repute** *hüq.* əxlaq normaları, hamı tərəfindən qəbul olunmuş davranış qaydaları; **2.** xasiyyət, xarakter, təbiət, meyl; *Habit is a second nature Vərdiş ikinci xasiyyətdir;* **a ~ of mind** düşüncə tərzi; **the inward ~** mənəvi aləm; **a person of spendthrift ~** bədxərc /israfçı /pulkorlayan adam; **3.** bədən quruluşu, qəddqamət; **a man of portly ~** iri/cüssəli/canlı/boylu-buxunlu adam; **4.** *bot. zool.* zahiri görünüş; **a plant of creeping ~** döşənən/sərilən/yayılan bitki
**habit** ['hæbɪt] *n* II **1.** geyim, paltar *(xüsusi təyinatlı)*, kostyum, libas; **a monk's ~** rahibə cübbəsi; **2.** amazonka *(ata minmək üçün uzun qadın paltarı)*
**habit**[2] ['hæbɪt] *v* **1.** geyindirmək, geyindirib-keçindirmək; **2.** məskunlaşdırmaq; sakin olmaq, yaşamaq
**habitable** ['hæbɪtəbl] *adj* **1.** yaşayış üçün yararlı; *The old house is no longer habitable Bu köhnə ev yaşayış üçün artıq yararlı deyil;* **2.** yaşamalı; **the ~ earth** yer kürəsinin məskunlaşmış / adam yaşayan sahələri
**habitance** ['hæbɪtəns] *n arx.* = **habitation**
**habitant** ['hæbɪtənt] *n* I sakin
**habitant** ['hæbɪtɔŋ, 'æbɪtɔŋ] *n* II (*pl* **habitans**) **1.** *Kanadanın və ya Luizianının fransız mənşəli sakini;* **2.** *fransız mənşəli kiçik Kanada fermeri*
**habitat** ['hæbɪtæt] *n biol.* **1.** məskən, vətən *(bitkinin, heyvanın)*; **2.** təbii mühit/şərait
**habitation** [ˌhæbɪ'teɪʃn] *n* **1.** yaşama, bir yerdə yaşama, sakin olma, yaşayış; **fit for ~** yaşayış üçün yararlı; **2.** yaşayış yeri; **humble ~** miskin bir ev; **3.** kənd, qəsəbə
**habitual** [hə'bɪtʃuəl] *adj* **1.** adi, adət halını almış, adət edilmiş; *He took his habitual seat in the dining-table O, yemək masasının arxasında adəti yerində oturdu/əyləşdi;* **a ~ topic** adət edilmiş mövzu; **~ smile** adi gülüş; **~ joke** həmişəki zarafat; *His habitual practice is to study at home O, adəti üzrə evdə məşğul olur;* **to make / to render ~** adətə /vərdişə çevirmək, vərdiş halına keçirmək; **2.** kök salmış, mübtəla/ aludə olmuş; **a ~ drunkard** içki düşkünü; **a ~ liar** qatı yalançı; **a ~ criminal** islahedilməz cani, residivist; **a ~ offender** *hüq.* residivist *(dəfələrlə cinayət edən adam)*; **3.** irsi, ata-babadan qalma, fitri, anadangəlmə; **~ faith** ata-babadan qalma inam
**habitually** [hə'bɪtʃuəlɪ] *adv* adətən, adəti üzrə; *Tom is habitually late for school Tom adəti üzrə/həmişə olduğu kimi məktəbə gecikir*
**habituate** [hə'bɪtʃueɪt] *v* **1.** öyrətmək, alışdırmaq, öyrəşdirmək; **to ~ oneself to** *smth.* özünü bir

şeyə alışdırmaq, bir şeyə öyrəşmək; *He has habituated himself to hard work / getting up early O özünü ağır işə/erkən qalxmağa alışdırıb;* **to ~ a horse to the sound of gunfire** atı atəş səsinə alışdırmaq; 2. *amer. d.d.* tez-tez baş çəkmək, bir yerə ayaq açmaq

**habitude** ['hæbıtju:d] *n* 1. adi hal, adət halını almış vəziyyət; meyl; 2. xüsusiyyət, xassə, vərdiş halını almış qayda, nizam

**habitue** [hə'bıtjueı] *n fr.* bir yerə müntəzəm gedən adam, daimi müştəri; **a ~ of the Cafe Royal** Royal kafesinin daimi müştərisi; **a ~ of the opera** operanın daimi tamaşaçısı

**hacienda** [.hæsı'endə] *n* 1. böyük / geniş torpaq sahəsi olan malikanə *(Latın Amerikası ölkələrində)*; 2. kənd yerində fəaliyyət göstərən müəssisə

**hack**[1] [hæk] *n* I 1. toxa, kərki; külüng; dəmirkəsən çəkic; balaca çapacaq; 2. dəmirçi qələmi *(dəmir kəsmək üçün)*; 3. zərbə *(baltanın, külüngün və s.)*; 4. kərtik, dərin qırış, kələkötürlük; 5. kəsərti yarası, kəsik, çapıq; 6. nişan, kərtik *(ağacda)*; 7. zərbədən sonra ayaqda sıyrıntı *(futbolda)*; 8. quru öskürək

**hack** [hæk] *n* II 1. kirayə verilmiş at; 2. at *(minik və ya qoşqu atı)*; 3. yarımcins at *(cinsi olmayan at)*; 4. yabı; 5. hər cür ağır işi görən adam, yabı kimi işləyən adam; 6. günəmuzd yazar; cızma-qaraçı; 7. *amer. d.d.* taksi; 8. *d.d.* qəhbə, fahişə, şortu

**hack**[2] [hæk] *adj* 1. muzdlu; **a ~ writer / journalist** muzdlu cızma-qaraçı / jurnalist; 2. mənasız, çürük, bayağı, çeynənmiş, şit, duzsuz; cansıxıcı, darıxdırıcı, yeknəsəq; **a ~ speech** bayağı nitq

**hack**[3] [hæk] *v* I 1. kəsmək, doğramaq; **to ~ smth. to pieces** tikə-tikə doğramaq; *After the murderer had killed his victim, he hacked the body to pieces Qatil öz qurbanını öldürdükdən sonra onu tikə-tikə doğradı;* **to ~ at a tree** ağacı üzdən yarmaq/ qoparmaq; baltalamaq; *He hacked at the branch with an axe until it fell to the ground Budaq yerə düşənə qədər o, balta ilə ona ağır zərbələr endirdi;* 2. kəsmək; **to ~ one's chin in shaving** üzü qırxanda çənəni kəsmək; 3. dişəmək; 4. kərki/toxa ilə torpağı yumşaltmaq, kərki vurmaq; 5. budamaq *(ağacı, budaqları və s.)*; 6. yonmaq *(daşı)*; **a figure ~ed out of the rock** daşdan yonulmuş heykəl; 7. *id.* badalaq vurmaq, oyunçunun ayağına vurmaq; 8. quru-quru öskürmək

**hack** [hæk] *v* II 1. kirayə/icarəyə vermək; 2. günəmuzd yazar kimi işə götürmək; 3. ağır, cansıxıcı işlərdə istifadə etmək; 4. asta-asta atla getmək; *He hacked along the road O, atın üstündə yolla yorturdu*

**hackbut** ['hækbʌt] *n* dayandoldurum *(tüfəng)*

**hackee** ['hæki:] *n zool.* burunduk *(gəmirici heyvan)*

**hackery** ['hækərı] *n hind.* öküz arabası

**hack-hammer** ['hæk.hæməʳ] *n* daş baltası

**hackle**[1] ['hækl] *n* 1. *pl* cığa *(xoruzun və bəzi quşların boynundakı uzun parıldayan lələklər, tüklər)*; 2. süni milçək *(balıq tutmaq üçün)*; 3. daraq *(kətanı daramaq üçün)*; 4. itin boynundakı və belindəki tük;

◊ **to show ~s** tüklərini qabardıb davaya hazır olmaq, özündən çıxmaq; **to have *one's* ~s up** hirslənmək; **to get *smb.'s* ~s up** bir kəsi hirsləndirmək, cin atına mindirmək

**hackle**[2] ['hækl] *v* I daramaq, didmək *(kətanı və s.)*

**hackle** ['hækl] *v* II 1. doğramaq, parça-tikə etmək; 2. çapmaq, vurub qoparmaq, sındırmaq

**hack-log** ['hæklɔg] *n* kötük, ət kötüyü

**hackly** ['hæklı] *adj* pis doğranmış

**hackmatack** ['hækmətæk] *n bot.* qara şam *(ağac)*

**hackney** ['hæknı] *n* = 1. **hack** *n* II 1, 2; 2. ağır və cansıxıcı iş üçün muzdla tutulmuş işçi

**hackney-carriage** ['hæknı.kærıdʒ] *n* kirayə tutulmuş minik *(fayton, araba və s.)*

**hackney-chair** ['hæknı'tʃeəʳ] *n* çimərlikdə kirayə verilən kreslo, qoltuqlu kürsü

**hackney coach** ['hæknı'koutʃ] *n* = **hackney-carriage**

**hackneyed** ['hæknıd] *adj* mənasız, bayağı, çeynənmiş, boş, çürük; **a ~ phrase/subject** çeynənmiş fraza / mövzu

**hack-saw** ['hæksɔ:] *n tex.* dəmirkəsən mişar *(çilingər aləti)*

**hack-stand** ['hækstænd] *n amer.* icarəyə götürülmüş miniklər üçün dayanacaq

**hack-work** ['hækwə:k] *n* maraqsız/cansıxıcı iş

**hacky** ['hækı] *adj* tez-tez və quru *(öskürək)*

**had** [hæd] *(tam forma)*; [həd, əd, d] *(zəif formalar)* **to have** *felinin pt və pp formaları*

**had-dock** ['hædək] *n zool.* 1. treska *(Şimal dənizində yaşayan balıq)*; **smoked ~** hisə verilmiş treska; 2. *amer. d.d.* pul;

◊ **to bring ~ to paddock** ≅ qaş düzəltdiyi yerdə vurub gözünü çıxartmaq, hər şeyi itirmək / uduzmaq

**hadj** [hædʒ] *n ər.* Məkkə ziyarəti, həccə getmə

**Hadji** ['hædʒı] *n ər.* Hacı *(Məkkəni həcc vaxtı ziyarət etmiş müsəlman)*

**haemal** ['hi:məl] *adj anat.* qana və qan damarlarına aid

**haematic**[1] [hı'mætık] *n* qana təsir edən dərman

**haematic**[2] [hı'mætık] *adj* qana aid, qan kimi

**haemoglobin** [.hi:mou'gloubın] *n fiziol.* hemoqlobin

**haemophilia** [.hi:mou'fılıə] *n tib.* hemofiliya *(qanın kəsilməməsi/laxtalanmaması)*

**haemorrhage** ['hemərıdʒ] *n tib.* qanaxma, qansızma

**haemorrhoids** ['hemərɔıdz] *n pl tib* babasil

**haemostatic**[1] [.hi:mou'stætık] *n tib.* qanaxmanı dayandıran dərman

**haemostatic**[2] [.hi:mou'stætık] *adj* qanaxmanı dayandıran



**hafiz** ['ha:fız] *n ər.* hafiz *(Quranı əzbərdən bilən müsəlman)*

**haft** [ha:ft] *n* dəstə, qulp, tutacaq, sap

**hag** [hæg] *n* 1. küpəgirən /cadugər qarı; 2. əcinnə; 3. kaftar *(söyüş)*

**haggard**[1] ['hægəd] *n* I xırman

**haggard** ['hægəd] *n* II vəhşi/ələ öyrədilməmiş qızılquş, tərlan, böyümüş halda tutulmuş qızılquş/tərlan

**haggard**[2] ['hægəd] *adj* 1. əldən/haldan düşmüş, yorğun, üzgün; 2. böyümüş halda tutulmuş *(tərlan, qızılquş)*; 3. vəhşi / ələ öyrədilməmiş *(qızılquş, tərlan)*

**haggle** ['hægl] *v* 1. sövdələşmək, qiymət üstündə çənələşmək, mübahisə etmək; **to ~ about / over the terms of a bargain** sövdənin şərtləri üstündə mübahisə etmək; 2. necə gəldi doğramaq, parça-tikə etmək, kəsib korlamaq, doğrayıb xarab etmək, korlamaq

**haggler** ['hægləʳ] *n* 1. qiymət üstündə həmişə mübahisə edən adam; 2. *məc.* alverçi, çərçi

**hag-ridden** ['hæg.rıdn] *adj* qarabasmadan üzülmüş

**hah** [ha:] *int.* ha!

**haha** ['ha:ha:] *n fr.* alçaq çəpər *(bağın ətrafında)*

**ha-ha** ['ha:ha:] *int.* ha-ha-ha! *(qəhqəhə)*

**hail**[1] [heıl] *n* I dolu; **~ stones** dolu dənələri; **~ stones as big as peas** noxud boyda dolu dənələri; **a ~ of blows / curses** dolu kimi yağan zərbələr / söyüşlər

**hail** [heıl] *n* II 1. haylama, çağırma, səsləmə; 2. salam, salamlama; 3. ün çatan/yetən məsafə; **within/out of ~** eşitmə dairəsində/dairəsindən kənarda; *Keep within hail! Uzağa getmə! / getməyin!*

**hail**[2] [heıl] *v* I 1. dolu yağmaq; *It is hailing Dolu yağır; It hailed in the afternoon Axşamüstü dolu yağdı;* 2. yağdırmaq *(dolu kimi)*; **to ~ curses/blows** söyüş / zərbələr yağdırmaq; *They hailed curses down on us Onlar bizə söyüş/qarğış yağdırdılar;* 3. basmaq; **to ~ with stones /rotten eggs** daşa /lax yumurtaya basmaq

**hail** [heıl] *v* II 1. salamlamaq, qarşılamaq; *Cheerful voices hailed us as we entered the hall Zala daxil olanda şən səslər bizi salamladı; He was hailed as a hero Onu qəhrəman kimi qarşıladılar;* 2. çağırmaq, haylamaq; **to ~ a taxi** taksi çağırmaq; *Let's hail a taxi, shall we? Gəl/Gəlin taksi tutaq, ha..?;*

◊ **to ~ from** 1) əslən haralı olmaq; *Where do you hail from? Əslən haralısan?; He hails from London O, Londonludur*; 2) hansısa limandan olmaq, hansısa limana təhkim olunmaq; *Where does the ship hail from? Bu gəmi hansı limandandır?, Bu gəmi hansı limana təhkimdir?*

**hail**[3] [heıl] *int. Salam!*

**hail-fellow** ['heıl.felou] *n* yaxın dost, rəfiq; **to be ~ with *smb.*** bir kəslə yaxın dost olmaq

**hail-fellow-well-met** ['heıl.felou'wel'met] *n* = **hail-fellow**

**hail-stone** ['heılstoun] *n* dolu dənəsi

**hailstorm** ['heılstɔ:m] *n* dolu tufanı

**hain't** [heınt] 1. *(loru dildə)* **have not**-un *qısa*; 2. **am/is/are not**-un *qısa forması*

**hair**[1] [heəʳ] *n* 1. saç, zülf; **to brush/to comb *one's* ~** saçını daramaq; **to have *one's* ~ cut** saçını vurdurmaq/kəsdirmək/qırxdırmaq; **to do *one's* ~** saçını düzəltmək/qaydaya salmaq; **to lose *one's* ~** saçı tökülmək, dazlaşmaq; 2. tük; *I found a hair in my soup Şorbamın içindən tük tapdım;* 3. yun, qıl, qəzil, tük; **a cat with a fine coat of ~** ipək tüklü pişik; 4. xov, narın tük *(ipəkdə)*; 5. çox az məsafə; **within a ~ of** az qala, demək olar ki, tük qədər; **within a ~ of death** ölümdən tük qədər aralı; demək olar ki, ölüm ayağında;

◊ **to let *one's* ~ down** 1) özünü çox sərbəst aparmaq; 2) ürəyini boşaltmaq; *You can let your hair down in front of me Çəkinmə/Çəkinməyin, ürəyində / ürəyinizdə nə varsa hamısını mənə danış/danışın;* **not to turn a ~** özünü o yerə qoymamaq, tükü də tərpənməmək; **to tear *one's* ~** fəryad etmək, saçlarını yolmaq; *Keep your hair on! Özündən/Özünüzdən çıxma!/çıxmayın!, Cin atına minmə!/minməyin!;* **to make *smb.'s* ~ stand (on end)** tüklərini biz-biz etmək, ürəyini salmaq; **to get by the short ~s** 1) bərk-bərk tutub saxlamaq; 2) tam nəzarət etmək; **to loose *one's* ~** özündən çıxmaq; **to put *one's* ~ up** saçını başın ortasında yığmaq; **to have more ~ than wit** ağıldan kəm olmaq; ağlı dabanında olmaq; **to take a ~ of a dog that bit you** ≅ *Donuzdan bir tük çəkmək də qənimətdir*

**hair**[2] [heəʳ] *adj* 1. = **hairy**; 2. nazik, tük kimi

**hair**[3] [heəʳ] *v* 1. tükləri təmizləmək; 2. tük basmaq, tüklənmək; 3. tük kimi uzanmaq *(ərimiş isti qənd haq.)*

**hairband** ['heəbænd] *n* saç üçün lenta

**hairbreadth**[1] ['heəbredθ] *n* tük boyda/cüzi məsafə; **to miss by a ~** 1) cüzi səhv etmək; 2) çox az gecikmək

**hairbreadth**[2] ['heəbredθ] *adj* tük kimi nazik, çox cüzi/az; **~ difference** çox cüzi fərq; **to escape by a ~**; **to have a ~ escape** güclə canını qurtarmaq

**hairbrush** ['heəbrʌʃ] *n* saç / baş şotkası

**hairclipper** ['heəklıpəʳ] *n* baş qırxan maşın

**haircurler** ['heə.kə:ləʳ] *n* biqudi *(saçları burmaq üçün lüləcik)*

**haircut** ['heəkʌt] *n* 1. baş qırxma, saç kəsmə; 2. saç fasonu / forması / düzümü

**haircutter** ['heə.kʌtəʳ] *n* dəllək, bərbər

**hair-do** ['heədu:] *n* saç qoyma/saç düzəltmə forması; saç düzümü

**hairdresser** ['heə.dresəʳ] *n* qadın dəlləyi, dəllək, bərbər

**hair-dye** ['heədaı] *n* saç üçün rəng / boya

**hair-dyeing** ['heədaııŋ] *n* saçın rənglənməsi, xınayaxdı

**haired** ['heəd] *adj* tük basmış, tüklü, qıllı

**hairiness** ['heərɪnɪs] *n* tüklülük, qıllılıq, tük basma
**hairless** ['heəlɪs] *adj* tüksüz, daz
**hairline** ['heəlaɪn] *n* **1.** tük kimi nazik xətt; **2.** tük sap; **3.** xətt *(başda)*; ~ **co-operation** *hərb.* dəqiq qarşılıqlı əlaqə
**hair-net** ['heənet] *n* saç üçün tor
**hair-oil** ['heərɔɪl] *n* saç üçün yağ, saç yağı
**hair-pencil** ['heəpensl] *n* sulu boya üçün nazik fırça
**hairpin** ['heəpɪn] *n* baş sancağı, şpilka
**hair-raising** ['heə.reɪzɪŋ] *adj* tüKürpərdən, qorxulu, dəhşətli
**hair-remover** ['heərɪ.mu:və^r] *n* vacibat, tüktəmizləyən dərman
**hair-root** ['heəru:t] *n* tükün dibi
**hair's-breadth** ['heəzbredθ] *n, adj* = **hair-breadth**[1,2]
**hair-seal** ['heəsi:l] *n zool.* suiti
**hair-shirt** [heə'ʃə:t] *n* qıldan/qəzildən toxunma dərviş paltarı
**hair-sieve** ['heə'si:v] *n* qıldan toxunmuş ələk
**hair-splitter** ['heə.splɪtə^r] *n* xırdaçı, pedant, vasvası, kauzist *(təcrübəli mübahisəçi)*
**hair-splitting** ['heə.splɪtɪŋ] *n* xırdaçılıq, mübahisə, boş şey üstündə mübahisə
**hair-spring** ['heəsprɪŋ] *n* saat tükü; çox incə yay
**hair-trigger**[1] ['heə'trɪgə^r] *n hərb.* yumşaq tətik; həssas tətik
**hair-trigger**[2] ['heə'trɪgə^r] *adj d.d.* tündxasiyyət, tündməcaz, tez hirslənən, tez özündən çıxan, dəymədüşər
**hair-waving** ['heə.weɪvɪŋ] *n* buruq saç, burdurulmuş saç, zavivka
**hair-worm** ['heəwə:m] *n zool.* qılqurd
**hairy** ['heərɪ] *adj* **1.** tüklü, qıllı; **a ~ chest** tüklü/qıllı sinə; **2.** qıldan/tükdən qayrılmış / hazırlanmış
**Haitian** ['heɪʃjən] *n* haitili; **the ~s** haitililər
**Hajji** ['hædʒi:] *n* = **Hadji**
**hake** [heɪk] *n zool.* xek *(treska fəsiləsindən olan balıq)*
**halation** [hə'leɪʃn] *n fot.* fotoplastinkada parıltı/işıq ləkələri
**halberd** ['hælbəd] *n tar.* təbərzin
**halberdier** [.hælbə'dɪə^r] *n* **1.** *tar.* təbərzinlə silahlanmış əsgər; **2.** təbərzinlə silahlanmış keşikçi/qarovul
**halbert** ['hælbət] *n* = **halberd**
**halcyon**[1] ['hælsɪən] *n zool.* martin, suquzğunu *(quş)*
**halcyon**[2] ['hælsɪən] *adj* sakit, mülayim, dinc *(hava haq.)*; ~ **days** sakit günlər; ~ **weather** mülayim hava
**hale**[1] [heɪl] *adj* sağlam, möhkəm, güclü, canısulu *(qocalar haq.)*; ~ **old age** gümrah/ möhkəm ahıllıq; ~ **and hearty** sağlam və gümrah
**hale**[2] [heɪl] *v* **1.** çəkmək, sürümək; **2.** getməyə məcbur etmək, zorla dartıb aparmaq; **to ~ a man into court** bir kəsi zorla dartıb məhkəməyə aparmaq
**half**[1] [ha:f] *n (pl* **halves** [ha:vz]) **1.** yarı, yarım; yarısı; *The half of six is three Altının yarısı üçdür; Two halves make a whole İki yarı birləşdikdə tam olur; Half of the fruit is bad Meyvənin yarısı xarabdır; I want half as much again Mən bir yarım dəfə çox istəyirəm*; ~ **a dozen** yarım düjün; ~ **of the profit** gəlirin yarısı; ~ **an hour** yarım saat; **to rent at halves** iki nəfər üçün kirayə etmək *(evi, otağı)*; **in/ into ~, in/into halves** yarıbayarı, tən ortadan/yarı; **to cut in ~** tən yarıdan / ortadan kəsmək; **to cut the cost in ~** xərci iki dəfə azaltmaq; ~ **past 10** on birin yarısı *(vaxt)*; **2.** parça, hissə; *Your half is bigger than mine Sənin/Sizin parçan/parçanız mənimkindən böyükdür; The larger half of the fortune belongs to Tom Var-dövlətin böyük hissəsi Toma məxsusdur*; **3.** semestr, yarımil; **to enter school in the winter ~** qış semestrində məktəbə daxil olmaq; **to stay at school three halves** məktəbdə il yarım oxumaq; **4.** *hüq.* tərəf *(müqavilədə)*; **5.** *mürəkkəb sözlərin komponenti kimi:* yarım; **~back** yarımmüdafiəçi; **a ~ crown** yarımkrona *(2 şillinq 6 pens)*;
◊ **by ~** yarıyadək, yarısına qədər; **by halves** qismən; **to do** *smth.* **by halves** bir şeyi yarısına qədər etmək, yarımçıq qoymaq; **to go halves with** *smb.* bir kəslə yarıbayarı şərik olmaq; ***one's* better ~** bir kəsin arvadı; ~ **a fool ~ a knave** ≅ *Başqaları üçün səfeh, özünə gələndə ağıllı olur*; **to see** *smth.* **with ~ an eye** bir şeyi dərhal anlamaq; **to cry halves** düz yarısını tələb etmək;
◊ *Half a loaf is better than no bread at. söz.* ≅ *Soğan olsun, nəqd olsun*
**half**[2] [ha:f] *adj* **1.** yarı; **to own a ~ share in a business** hər hansı bir işdə sərmayənin / səhmlərin yarısına sahib olmaq; **2.** natamam, qismən, iki müxtəlif hissədən ibarət; **a ~ knowledge of the subject** fənni qismən bilmə;
◊ *Half angel half bird* ≅ *Nə atdır, nə balıq*
**half**[3] [ha:f] *adv* **1.** qismən, yarısı, yarıyadək; *He is half persuaded Onu qismən inandırdıq*; **2.** demək olar ki; *My leave is half up Mənim məzuniyyətim demək olar ki, qurtarır*; **3.** çox, olduqca, son dərəcə, həddindən artıq; *She isn't half clever O heç də ağılsız deyil, O çox ağıllıdır; He didn't half swear O çox söyüş söydü; He isn't half a liar O çox yalançıdır*; **4.** heç, qəti, əsla, qətiyyən, bilmərrə; *I don't half like it Mənim bundan qətiyyən xoşum gəlmir; Not half bad! Pis deyil!, Ağıllı işdir!*;
◊ ~ **as much** iki dəfə az; ~ **as much / old again** bir yarım dəfə çox / yaşlı
**half-and-half**[1] ['ha:fən(d)'ha:f] *n* iki müxtəlif və bərabər hissədən ibarət qarışıq içki/maye
**half-and-half**[2] ['ha:fən(d)'ha:f] *adj* **1.** iki müxtəlif hissədən ibarət olan; **2.** mütərəddid, qətiyyətsiz



**half-and-half**[3] ['ha:fən(d)'ha:f] *adv* yarıbayarı, bərabər
**half-back** ['ha:f'bæk] *n id.* yarımmüdafiəçi; ~ **line** yarımmüdafiə xətti
**half-baked** ['ha:f'beɪkt] *adj* **1.** yaxşı bişməmiş, alaçiy bişmiş; ~ **bread** alaçiy bişmiş çörək; **2.** *məc.* bişməmiş, təcrübəsiz; ~ **youth** bişməmiş /təcrübəsiz cavan/gənc; **3.** çiy, lazımınca düşünülməmiş; ~ **theories** çiy/lazımınca düşünülməmiş nəzəriyyələr
**half-blooded** ['ha:f'blʌdɪd] *adj* müxtəlif irqlərə məxsus ata-anadan törəmiş, mələz, metis
**half-blue** ['ha:fblu:] *n id.* yarışda ikinci yeri tutmuş idmançılara verilən mükafat
**half-bred** ['ha:fbred] *n k.t.* yarımcins, cins olmayan heyvan
**half-breed** ['ha:fbri:d] *n* **1.** müxtəlif irqlərə məxsus ata-anadan törəmiş şəxs; **2.** metis, mələz; **3.** *k.t.* yarımcins
**half-cap** ['ha:fkæp] *n* laqeyd, saymazyana salam
**half-caste** ['ha:fka:st] *n* qarışıq irqli adam
**half-circle** ['ha:fsə:kl] *n* yarımdairə
**half-cock** ['ha:fkɔk] *n* qoruyucu tətik *(tüfəngdə çaxmağı yarımçıq geri çəkmə)*; **to go off at ~** *məc.* ehtiyatsız hərəkət etmək, lazımınca düşünmədən danışmaq
**half-cocked** ['ha:f'kɔkt] *adj amer. d.d.* hazırlanmamış, hazırlıqsız, təcrübəsiz
**half-crown** ['ha:f'kraun] *n* yarımkrona *(2 şillinq 6 pens)*
**half-dime** ['ha:fdaɪm] *n* 5 sent dəyərində amerikan dəmir pulu
**half-done** ['ha:f'dʌn] *adj* **1.** yarımçıq qoyulmuş/edilmiş; **2.** alaçiy
**half-dozen** ['ha:f'dʌzn] *n* yarım düjün
**half-eagle** ['ha:f'ɪ:gl] *n tar.* 5 dollar dəyərində amerikan qızıl sikkəsi
**half-fare** ['ha:ffeə] *n* yarıbilet, 50% güzəştlə verilən bilet *(həm də* **a ~ ticket**); **to travel at ~** gediş haqqının yarısını ödəmək
**half-hardy plant** ['ha:f.ha:dɪ'pla:nt] *n* qışda örtülməsi və ya basdırılması tələb olunan bitki
**half-hearted** ['ha:f'ha:tɪd] *adj* **1.** qətiyyətsiz, mütərəddid, cəsarətsiz; **a ~ attempt** cəsarətsiz cəhd; **2.** laqeyd, marağı olmayan; **in a ~ way** laqeyd halda; **3.** tamamilə bir-birinə zidd / uymayan
**half-hearty** ['ha:f'ha:tɪ] *adj məc.* ürəksiz, həvəssiz; ~ **attempt** ürəksiz cəhd
**half-heartedly** ['ha:f'ha:tɪdlɪ] *adv* tərəddüdlə, mütərəddid bir surətdə, qəti olmayaraq
**half-holiday** ['ha:f'hɔlədɪ] *n* qısa iş günü
**half-hose** ['ha:f'houz] *n* qolfi, noski, gödək corab
**half-hourly**[1] ['ha:f'auəlɪ] *adj* **1.** hər yarım saatdan bir baş verən / təkrar olunan; **2.** yarımsaatlıq
**half-hourly**[2] ['ha:f'auəlɪ] *adv* hər yarım saatdan bir, yarım saatda bir dəfə
**half-length** ['ha:f'leŋθ] *n* qurşaqdan yuxarı çəkilmiş portret / şəkil
**half-mast**[1] ['ha:f'ma:st] *n* endirilmiş vəziyyət; **flag at ~** azca endirilmiş bayraq
**half-mast**[2] ['ha:f'ma:st] *adv* bir az endirilmiş vəziyyətdə *(bayraq haq.)*
**half-mile** ['ha:f'maɪl] *n* yarımmil
**half-moon** ['ha:f'mu:n] *n* aypara, hilal
**half-pay** ['ha:f'peɪ] *n* yarım maaş; **to put** *smb.* **on ~** bir kəsi yarım maaşa keçirmək
**half-penny**[1] ['heɪpnɪ] *n d.d.* yarım pens *(İngiltərədə pul vahidi)*
**half-penny**[2] ['heɪpnɪ] *adj d.d.* qəpik-quruşa dəyən, ucuz; aşağı əyarlı
**half-pennyworth** ['heɪpnɪwə:θ] *n d.d.* qəpik-quruşa dəyən bir şey
**half-pound**[1] ['ha:fpaund] *n* yarım girvənkə
**half-pound**[2] ['ha:fpaund] *adj* yarım girvənkə; yarım girvənkə ağırlığında olan
**half-pounder** ['ha:f'paundə^r] *n* yarım girvənkə ağırlığında olan şey
**half-price** ['ha:f'praɪs] *n* yarı qiymət; **at ~** yarıqiymətə
**half-roll** ['ha:f'roul] *n av.* cinahdan çevrilmə, qanadı üstə çevrilmə
**half-round**[1] ['ha:f'raund] *n* yarımdairə
**half-round**[2] ['ha:f'raund] *adj* yarımdairəvi
**half-sister** ['ha:f.sɪstə^r] *n* anabir və ya atabir bacı, ögey bacı
**half-seas-over** ['ha:fsɪ:z'ouvə] *adj* **1.** yarı yolda *(gəmi haq.)*; **to be ~ to** *smth.* bir şeyə çatmaqda yarı yolda olmaq; **2.** *d.d.* sərxoş, içkili; ≅ *Araz aşığından, Kür topuğundan (olmaq)*
**half-sovereign** ['ha:f'sɔvrɪn] *n* yarım soverna *(10 şillinq dəyərində qızıl ingilis sikkəsi)*
**half-story** ['ha:f.stɔrɪ] *n mem.* mansarda *(çatı altında çəp tavanlı otaq)*
**half-time** ['ha:f'taɪm] *n* **1.** yarım iş həftəsi/ günü; **to go on ~** yarım iş həftəsinə/gününə keçmək; *Owing to the business depression the workers are on half-time this month Biznesdə durğunluq yarandığından fəhlələr bu ay yarım iş gününə keçirlər*; **2.** tam olmayan iş həftəsi / günü üçün əməkhaqqı; **3.** *id.* oyunun yarısında/taymlar arasında fasilə; *The score at half-time was 2-2 Birinci taymda hesab 2-2 idi*
**half-timer** ['ha:f'taɪmə^r] *n* **1.** yarı işsiz, tam həftə işləməyən fəhlə; **2.** dərslərin bir qismindən azad edilmiş şagird *(işlədiyinə görə)*
**half-tone** ['ha:f'toun] *n mus.* yarımton
**half-track** ['ha:f'træk] *n amer.* yarım tırtıllı maşın; ~ **tank** yarım tırtıllı/yarım çarxlı tank
**half-truth** ['ha:f'tru:θ] *n* yarıgerçəklik; *A half-truth is often a falsehood Yarıgerçəklik əksər hallarda yalandan fərqlənmir*
**half-way**[1] ['ha:f'weɪ] *adj* **1.** yarı yolda olan; ~ **house** yarı yolda olan mehmanxana *(iki şəhər arasında)*; **2.** *məc.* yarımçıq, güzəştli; ~ **mea-**

**sures** yarımçıq tədbirlər; 3. orta; **a ~ line** orta xətt *(futbolda)*
**half-way**$^{2}$ ['ha:f'weı] *adv* 1. yarı yolda; **to meet** ***smb.*** **~** 1) bir kəsi yarı yolda qarşılamaq; 2) *məc.* qarşılıqlı güzəştə /kompromisə getmək; 2. demək olar ki, azqala, qismən; *He half-way yielded O, demək olar ki, güzəştə getdi / razılaşdı*
**half-wit** ['ha:fwıt] *n* səfeh, axmaq, gic, sarsaq *(adam)*
**half-witted** ['ha:f'wıtıd] *adj* kəmağıl, ağlı zəif, ağlı çatmayan, gictəhər
**half-word** ['ha:f'wə:d] *n* eyham, üstüörtülü söz
**half-year** ['ha:fjə:] *n* 1. yarımil; 2. semestr; **first / second ~** birinci / ikinci semestr
**half-yearly**$^{1}$ ['ha:f'jə:lı] *adj* 1. yarımillik; **~ meeting** yarımildə/altı ayda bir dəfə keçirilən yığıncaq; 2. altı ayda/yarımildə bir dəfə çıxan *(jurnal və s.)*
**half-yearly**$^{2}$ ['ha:f'jə:lı] *adv* ildə iki dəfə, altı aydan bir
**halibut** ['hælıbət] *n* paltus *(kambala cinsli balıq)*
**halite** ['hælaıt] *n miner.* daş duz, natrixlor
**halitosis** [,hælı'tousıs] *n tib.* ağızda pis iy/ qoxu, üfunətli nəfəs
**hall** [hɔ:l] *n* 1. salon, zal; **a concert ~** konsert salonu; **waiting ~** gözləmə zalı; **a banqueting ~** banket zalı; **servants' ~** xidmətçilər üçün yer / otaq; 2. universitet və ya kollec tələbələrinin məşğələ və yığıncaqları üçün bina; 3. universitet və ya kollec tələbələri üçün yataqxana; 4. universitet yeməkxanası; **dinner in ~** universitet yeməkxanasında nahar yeməyi; 5. inzibati bina; **Hall of Justice** məhkəmə binası; 6. koridor, hol, vestibül; *Leave your hat and coat in the hall Şlyapa və paltonu/paltonuzu holda qoy/qoyun;* 7. mülkədar evi, malikanə
**hallage** ['hɔ:lıdʒ] *n arx.* yerpulu; birdəfəlik rüsum *(bazarda satılan mal üçün)*
**hall-bedroom** ['hɔ:l'bedrum] *n amer.* 1. *koridorun arxasına ilə ayrılmış və yataq otağı kimi istifadə olunan hissəsi;* 2. birbaşa koridora açılan yataq otağı; 3. ucuz mebelli otaq
**hall-door** ['hɔ:ldɔ:ʳ] *n* giriş qapısı
**hall-mark**$^{1}$ ['hɔ:l'ma:k] *n* prob/əyar möhürü / nişanı; prob, əyar
**hall-mark**$^{2}$ ['hɔ:l'ma:k] *v* 1. prob / əyar nişanı/möhürü vurmaq; **to ~ gold** qızıla əyar /prob nişanı vurmaq; 2. keyfiyyətini təyin etmək
**hallo(a)** [hə'lou] *int* Allo! Salam!
**halloo**$^{1}$ [hə'lu:] *v* 1. saldırmaq, qısqırtmaq *(itləri ovun üzərinə);* 2. diqqəti cəlb etmək üçün hündürdən qısqırtmaq;
◊ *Don't halloo until you are out of the wood ≅ Çay gəlməmiş çırmanma!*
**halloo**$^{2}$ [hə'lu:] *int.* 1. Hey! Hey… hey! Ho…ho…ho! *(diqqəti cəlb etmək üçün)*; 2. Tut! Qoyma! Al! *(itlərə əmr)*
**hallow**$^{1}$ ['hælou] *n* 1 *arx.* 1. övliya, pir; **All ~s' day** *kil.* 1 Noyabr övliyalar günü, müqəddəs gün; 2. *pl* qurumuş müqəddəs cəsədlər; təbərrük, tutya
**hallow** [hæ'lou] *n* II itləri ovun üstünə qısqırtmaq/saldırmaq üçün çıxarılan səs
**hallow**$^{2}$ ['hælou] *v* I 1. xeyir-dua vermək; 2. paklamaq; 3. müqəddəsliyini / qüdsiyyətini təsdiq etmək; 4. hörmətlə anmaq / qeyd etmək; 5. göz bəbəyi kimi qorumaq
**hallow** ['hælou] *v* II ardınca qışqırmaq, hay-küylə müşayiət etmək
**hallow**$^{3}$ [hæ'lou] *int.* = **halloo**$^{2}$
**Hallowmas** ['hæloumæs] *n din.* övliyalar günü (1 noyabr)
**hallucinate** [hə'lu:sıneıt] *v* hallyusinasiyaya tutulmaq; qara basmaq, gözə görünmək
**hallucination** [hə'lu:sı'neıʃn] *n* hallyusinasiya, qarabasma, gözəgörünmə; *Drunken men are sometimes subjected to hallucination Sərxoş adamlar bəzən hallyusinasiyaya məruz qalırlar*
**hallucinator** [hə'lu:sıneıtəʳ] *n* hallyusinasiya tutulmuş şəxs
**hallucinatory** [hə'lu:sıneıtərı] *adj* 1. hallyusinasiya ilə səciyyələnən; 2. hallyusinasiyaya səbəb olan
**hallux** ['hæləks] *n (pl* **halluces)** *anat.* baş barmaq *(ayaqda)*
**hallway** ['hɔ:lweı] *n amer.* 1. koridor; 2. dəhliz
**halm** [ha:m] *n* = **haulm**
**halo**$^{1}$ ['heılou] *n (pl* **-os, oes** [ouz]) 1. *astr.* halə, şəfəq, parıltı, nur; planetlərin çevrəsindəki şəfəq dairəsi / çəmbəri; **solar ~** günəşətrafı şəfəq / şölə, günəş diski çevrəsindəki şölə / şəfəq; 2. *məc.* zirvə; **the ~ of glory** şöhrətin ən yüksək zirvəsi
**halo**$^{2}$ ['heılou] *v* halə ilə / şəfəqlə əhatə olunmaq / dövrələnmək
**halogen** ['hæloudʒen] *n kim.* haloid *(kimyəvi element)*
**halt**$^{1}$ [hɔ:lt] *n* I 1. düşərgə salma, dayanma; **to call a ~** dayanmaq, düşərgə salmaq; 2. *hərb.* hərəkəti, irəliləməni dayandırma; *The officer called a halt Zabit dayanmaq əmri verdi; At the halt! Yerində dur!* 3. dayanacaq, yarımstansiyada dayanma; *The train came to a halt Qatar yarımstansiyada dayandı*
**halt** [hɔ:lt] *n* II 1. duruxma, tutulma *(danışarkən)*; *He has a halt in his speech O tutula-tutula danışır, O danışanda tutulur;* 2. *arx.* axsaqlıq
**halt**$^{2}$ [hɔ:lt] *adj arx.* axsaq; **the ~** axsaqlar; **the ~ and the blind** axsaqlar və korlar
**halt**$^{3}$ [hɔ:lt] *v* I 1. dayandırmaq; *The officer halted his troops for a rest Zabit qoşunları istirahət üçün dayandırdı; Halt! hərb. Dur! /Durun!;* 2. dayanmaq; düşmək, qalmaq; **to ~ at an inn** mehmanxanada qalmaq; 3.: **~ and freeze** *hərb.* "fərağat" vəziyyətində dayanmaq
**halt** [hɔ:lt] *v* II 1. tərəddüd etmək; **to ~ between two opinions** iki fikir arasında qalmaq; 2. hıqqanmaq, dili dolaşmaq, duruxa-duruxa danışmaq; 3. *arx.* axsamaq, səndələmək
**halter**$^{1}$ ['hɔ:ltəʳ] *n* 1. cilov, yedək; 2. ilgək *(dar ağacında)*; **to come to the ~** dar ağacından asılmaq;
◊ **to put a ~ round** ***one's*** **own neck** özü öz əli ilə kəndiri boğazına keçirmək
**halter**$^{2}$ ['hɔ:ltəʳ] *v* 1. noxtalamaq, ovsarlamaq; 2. cilova/yüyənə öyrətmək; 3. *məc.* cilovlamaq
**halve** [ha:v] *v* 1. yarı bölmək; **to ~ the expenses** xərcləri yarı bölmək; 2. iki dəfə azaltmaq; *That will halve the profits Bu, gəlirləri iki dəfə azaldacaq; The newest planes have halved the time needed for crossing the Atlantic Ən yeni təyyarələr Atlantik okeanını keçmək üçün lazım olan vaxtı iki dəfə azaldır*
**halves** [ha:vz] **half** *isminin cəm forması*
**halyard** ['hæljəd] *n* 1. *dən.* fal *(gəmilərdə yelkənləri, siqnal bayraqlarını və s. qaldırmaq üçün ip)*; 2. *rad.* antenanı qaldırmaq və endirmək üçün ip
**ham** [hæm] *n* 1. donuz budu, vetçina *(qaxac edilmiş donuz əti/budu)*; **~ and eggs** vetçina ilə qayğanaq; 2. omba, bud; 3. *pl tab. s.* dal, göt; **to squat on** ***one's*** **~s** çömələrək/sallağı oturmaq, çöməlmək; 4. *amer. d.d.* 1) pis aktyor; 2) pis oyun
**hamadryad** [,hæmə'draıəd] *n əs.* 1. nimfa, ilahə *(meşə ilahəsi)*; 2. *zool.* kobra *(gözlüklü zəhərli ilan)*
**hamate** ['heımıt, 'heımeıt] *adj* qarmaqşəkilli, qarmağa oxşayan, qarmaq kimi
**hamble** ['hæmbl] *v arx.* 1. şikəst etmək; 2. axsamaq, ayağını çəkmək
**hamburger** ['hæmbə:gəʳ] *n* hamburqer *(içərisinə odda qızardılmış və doğranmış ət qoyulmuş bulka)*
**Hamburgh** ['hæmbərə] *n* 1. qara üzüm növü; 2. "Hamburq" cinsli yumurtalıq toyuq; 3. Hamburq bifşteksi
**hamlet** ['hæmlıt] *n* 1. balaca kənd, oba; 2. balaca kəndin sakinləri
**hammam** [hʌ'ma:m] *n* şərq/türk hamamı
**hammer**$^{1}$ ['hæməʳ] *n* 1. çəkic, gürz *(böyük çəkic)*; **~ and sickle** oraq-çəkic; 2. kiçik çəkic *(mexanizm hissəsi / detalı)*; **a ~ of a piano** pianinonun çəkici; 3. *anat.* çəkic *(qulaqda)*; 4. hərrac / auksion çəkici; **to bring/to send to the ~** hərracla satmaq; **to come to/under the ~** hərracla satılmaq; 5. *hərb.* çaxmaq *(tüfəngdə)*; 6. yuxarıdan çənəyə zərbə *(boksda)*; 7. *d.d.* boksçu
**hammer**$^{2}$ ['hæməʳ] *v* 1. çəkiclə vurmaq; **to ~ nails into a board** mıxları taxtaya vurmaq; 2. döymək *(dəmiri)*; **to ~ iron** dəmiri döymək; **to ~** ***smth.*** **into shape** bir şeyi döyüb formaya salmaq; 3. vurmaq, döymək, döyəcləmək; **to ~ at / on the door** qapını döyəcləmək; 4. beyninə yeritmək, başa salmaq, qandırmaq; **to ~ rules into** ***smb.'s*** **head** qaydaları bir kəsin beyninə yeritmək; 5. (at) bir şeyin üzərində gərgin işləmək; **to ~ away at a problem** problemin üzərində gərgin işləmək; **to ~ at a book** kitabı dərindən öyrənmək; 6. bankrot/müflis elan etmək; *He was hammered a defaulter O, bankrot /müflis elan edildi;* **to ~ away** davam etdirmək *(işi)*; **to ~ away at** ***smth.*** bir şeyi inadla davam etdirmək; **to ~ down** tənzimləmək, yoluna qoymaq; **to ~ down an irregularity** anlaşılmazlığı həll etmək; **to ~ out** 1) vurub çıxarmaq; 2) yastılatmaq; 3) *məc.* fikirləşib tapmaq; uydurmaq, icad etmək; **to ~ out an excuse** çətinliklə fikirləşib bəraət üçün səbəb tapmaq; **to ~ together** quraşdırmaq, vurub bitişdirmək
**hammer-blow** ['hæməblou] *n* ağır, sarsıdıcı zərbə
**hammering** ['hæmərıŋ] *n* 1. döymə *(dəmiri)*, zərb etmə; 2. taqqıltı, tıqqıltı, zərbə; *The hammering on the door ceased Qapıdakı taqqıltı kəsildi;* 3. *d.d.* qulaqburması vermə; **to give** ***smb.*** **a good ~** bir kəsi yaxşıca kötəkləmək/ döymək/ əzişdirmək/qapazlamaq
**hammersmith** ['hæməsmıθ] *n* dəmirçi
**hammer welding** ['hæmə'weldıŋ] *n* dəmirçi qaynağı
**hammock** ['hæmək] *n* qamak *(tor yelləncək)*; asma çarpayı
**hammock-chair** ['hæmək'tʃeəʳ] *n* qatlama stul *(oturacağı parçadan olan)*
**hamper**$^{1}$ ['hæmpəʳ] *n* 1. böyük qapalı toxunma səbət; 2. dadlı yeməklərlə, şirniyyatla dolu səbət; **a Christmas ~** yemək, şirniyyat və şərabla dolu mövlud hədiyyəsi olaraq göndərilən səbət; **to get a fine ~ from home** evdən dadlı yeməkiçməklərlə dolu posılka / bağlama almaq
**hamper**$^{2}$ ['hæmpəʳ] *v* mane olmaq, maneçilik törətmək, əngəl/çətinlik törətmək; hərəkətə mane olmaq; *The swimmer was hampered by his clothes Üzgüçüyə paltarları mane olurdu; We are seriously hampered by the persistent bad weather Ara verməyən iyrənc/murdar hava bizə çox ciddi mane olur*
**hamshackle** ['hæmʃækl] *v* 1. sarımaq, çidarlamaq *(heyvanı)*; **to ~ a horse** atı çidarlamaq; 2. *məc.* sakitləşdirmək, ram etmək
**hamster** ['hæmstəʳ] *n zool.* dağsiçanı
**hamstring**$^{1}$ ['hæmstrıŋ] *n anat.* 1. dizaltı vətər; 2. Axilles vətəri *(baldır əzələlərinin dabana bağlı olan vətəri)*
**hamstring**$^{2}$ ['hæmstrıŋ] *v (pt, pp* **~ed**, *və ya* **hamstrung** ['hæmstrʌŋ]) 1. dizaltı vətəri kəsmək; 2. *məc.* şikəst etmək, korlamaq
**hand**$^{1}$ [hænd] *n* I 1. əl; **the back of the ~** əlin arxası/üstü; **to vote by show of ~s** əl qaldırmaqla səs vermək; *Are your socks knitted by hand or machine-made Corabların/Corablarınız əldə toxunub ya maşında?;* **to go on** ***one's*** **~s and**

knees iki əli və iki dizi üstə iməkləmək /sürünmək; **to take / to lead *smb.* by the ~** bir kəsin əlindən tutub aparmaq; *He writes with his left hand O, sol əlilə yazır; He has his hands tied Onun əl-qolu bağlıdır (həm də məc.);* **with *one's* own ~** *hüq.* öz əlilə, şəxsən; 2. pəncə, ayaq; *The monkey has four hands Meymunun dörd ayağı var;* **the ~ of the parrot** tutuquşunun ayağı; 3. tərəf, mövqe, yer, vəziyyət; **on all ~s** hər tərəfdən; **fact admitted on all ~s** hamı tərəfindən qəbul edilmiş fakt; *At his right hand sat the President Onun sağ tərəfində prezident oturdu;* 4. 1) nəzarət; səlahiyyət, güclü /cəsarətli / möhkəm əl; **to act with a heavy ~** amansızcasına hərəkət etmək; **to rule with a heavy ~** qəddarlıq-la/vəhşicəsinə idarə etmək; **to put down a revolt with a heavy ~** üsyanı /qiyamı amansızlıqla yatırtmaq; **believers in the strong ~** sərt tədbir tərəfdarları; 2) *pl* sahiblik, sərəncam, binagüzarlıq; **to change ~s** başqa ələ keçmək, satılmaq; *The hotel has changed hands Mehmanxananın təzə sahibi var, Mehmanxana satılıb;* **to be in *smb.'s* ~s** bir kəsin əlində/ixtiyarında/sərəncamında olmaq; *The property is no longer in my hands Mülk artıq mənim əlimdə deyil; The matter is in your hands Məsələnin/İşin həlli sənin/sizin əlindədir /əlinizdədir; He is still in the hands of the moneylenders O hələ də sələmçilərin əlində qalır; My fate is in your hands Mənim taleyim sənin / sizin əlindədir / əlinizdədir;* 5. 1) razılıq, vəd, söz vermə; *Here's my hand on it! Sənə / Sizə söz verirəm!;* 2) nikaha razılıq; **to ask *smb.'s* ~** bir kəsə evlənməyi təklif etmək; 3) *pl* qayğı, himayə; **to take *smth.* on *one's* ~s** bir şeyi öz əlinə/himayəsinə götürmək; *He has a family on his hands Ailənin qayğısı onun üzərinə düşür;* **to be in good ~s** yaxşı əllərdə olmaq, qayğı ilə əhatə olunmaq; **to get off *one's* ~s** başdan eləmək, canını/yaxasını qurtarmaq; *I'd be glad to get it off my hands Bundan canımı qurtarsaydım, şad olardım;* 6. kömək, yardım, əl tutma; **to give/to lend a ~** yardım/kömək etmək, əl uzatmaq/tutmaq; *Lend me a hand with my coat Kömək et / edin, paltomu geyim; Give me a hand with the washing-up, please Lütfən, qabları yumaqda mənə kömək et/edin;* 7. əl *(oyunda);* **to win the ~** oyunu bir əl udmaq; *Let's have a hand at chess Gəl/ Gəlin bir əl şahmat oynayaq*

**hand** [hænd] *n* II 1. fəhlə, işçi *(əsasən pl); The factory has taken 200 extra hands Fabrik işə 200 nəfər artıq fəhlə götürüb; Hands wanted! Fəhlə/İşçi tələb olunur!;* 2. dənizçi; *pl* gəmi heyəti, ekipaj; *All hands on deck! Hamı yuxarı! All hands to quarters! Hər kəs öz yerinə! Hamı öz yerini tutsun!;* 3. müəllif, icraçı; **a book written by various ~s** müxtəlif müəlliflər tərəfindən yazılmış kitab; 4. hər bir işi bacaran, əlindən hər bir iş gələn/mahir / qabil adam; *He is quite a hand with the violin O, mahir skripka çalandır; He is a fine hand at cooking O, mahir aşpazdır; He's an old hand at this sort of work Belə işlərdə o, çox təcrübəli işçidir;* 5. xətt; **to write a very legible ~** çox aydın/ oxunaqlı xətlə yazmaq; *He has a beautiful small hand Onun gözəl xırda xətti var;* 6. *d.d.* alqış; **to give *smb.* a big ~** bir kəsi gurultu ilə alqışlamaq; 7. mənbə *(xəbər, məlumat haq.);* **a story heard at a second ~** ikinci şəxsdən eşidilmiş əhvalat; *He has it from several hands Ona bu barədə bir neçə adam danışıb*

**hand** [hænd] *n* III 1. əqrəb *(saatda, kompasda və s.);* **minute/second ~ of a watch** saatın dəqiqə / saniyə əqrəbi; 2. göstərici, işarə; 3. *d.y.* semaforun cinah seksiyası; 4. dəstə, bağlama; **a ~ of tobacco** bir bağlama tütün yarpağı; 5. bud *(donuzda);* **a ~ of pork** donuz budu; 6. cilov, yüyən;
◊ **the ~ of God** ilahi qüvvə, qəzavü-qədər; hikməti-ilahiyyə; **at/on ~** 1) əlinin altında, lap yaxında; *He lives close at hand O lap yaxında yaşayır;* 2) tezliklə, tez bir zamanda, bu yaxınlarda; *Christmas was close at hand Mövlud bayramı yaxınlaşırdı; Dawn is at hand Dan yeri sökülür; The examinations are at hand İmtahanlar yaxınlaşır;* **at the ~ of** əli ilə, əlində; *He died at the hand of a murderer O, qatilin əlilə öldürüldü;* **by ~** qasidlə, kuryerlə; **to send a letter by ~** qasidlə/kuryerlə məktub göndərmək; *The note was delivered by hand Məktub qasidlə/kuryerlə göndərildi;* **to bring up/to feed a child by ~** uşağı süni yolla qidalandırmaq; *The lamb had to be brought up by hand Quzunu əldə böyütmək lazım gəldi;* **to bring up to *one's* ~** ələ öyrətmək; **~ in ~** əl-ələ, birgə; *They walked away hand-in-hand Onlar əl-ələ verib çıxıb getdilər;* **in ~** 1) əldə; *He still has some money in hand Onun əlində hələ bir az pul qalıb;* 2) nəzarət altında; **to bear *smb.* in ~** bir kəsi öz nəzarəti/təsiri altında saxlamaq; **to keep *smth.* well in ~** gözünün üstündə saxlamaq, yaxşı qulluq etmək / baxmaq; *He keeps the car well in hand O, maşını gözünün üstündə saxlayır, O, maşına yaxşı qulluq edir;* **off ~, out of ~** 1) dərhal, fövrən, göz qırpımında, göz yumub açınca, cəld, bir ləhzədə; *The situation needs to be dealt with out of hand Bu vəziyyəti dərhal qaydaya salmaq lazımdır;* 2) nəzarətsiz; *The football fans have got out of hand Futbol azarkeşləri tamamilə nəzarətdən çıxıblar; His wrath got out of hand Onu kortəbii qəzəb bürüdü;* **to have an hour on *one's* ~s** əlində bir saat vaxtı olmaq; *I have too many goods on my hands Əlimdə həddindən çox malım var;* **from ~ to ~** əldən ələ; **~ over ~, ~ over fist** əlüstü, cəld və asanca; **to drink ~ to fist** həddindən artıq içmək; **~ in/and glove (with)** yaxın əlaqədə/ canbir qəlb olma, sıx əməkdaşlıq etmə; *They are hand in glove Onlar canbir qəlbdirlər; We were hand and glove, the old man and me Bu yaşlı qoca ilə mən canbir qəlb olmuşuq;* **to be heart and ~ for *smth.*** bir şeyi səmimi qəlbdən müdafiə etmək; **~ and foot** vicdanla, insafla; **to serve ~ and foot** vicdanla qulluq / xidmət etmək; **to win (with) ~s down** asanlıqla qalib gəlmək; **to live from ~ to mouth** çətinliklə/güc-bəla ilə dolanmaq; **to come cap in ~ to *smb.*** xahişlə / təvəqqe ilə / rica ilə bir kəsə müraciət etmək, bir kəsin qarşısında alçalmaq; **to make a ~** əli gətirmək, uğur qazanmaq; **to get better ~** üstünlük qazanmaq /əldə etmək; **to get / to have the upper ~** üstün olmaq, qalib gəlmək; **for *one's* own ~** öz xeyrinə, özü üçün; *He fought for his own hand O öz şəxsi maraqlarını/mənafelərini müdafiə edirdi;* **on the one ~ ...on the other ~** bir tərəfdən... digər/o biri tərəfdən; **to be on the mending ~** sağalmaq; **to keep oneself well in ~** özünü ələ almaq; **to shake ~s with** əl verib görüşmək/salamlaşmaq; əl verib xudahafizləşmək/vidalaşmaq; **to kiss *one's* ~ to *smb.*** kiməsə öpüş göndərmək; **to strike ~s** sövdə kəsmək, razılaşmaq, düzəlişmək; **to spend money with both ~s** pulu sağa-sola xərcləmək; **to have clean ~s** 1) namuslu/düz/ təmiz olmaq, 2) *məc.* əli təmiz olmaq; **to put the last ~ to *smth.*** tərtəmiz/tamamilə qurtarmaq; **to have *one's* ~s full** işi başından aşmaq, başını qaşımağa vaxtı olmamaq, işi xirtdəyə çıxmaq; **to set/to put *one's* ~s to a task** işə girişmək; *I don't know what to put my hands to first Heç bilmirəm, nədən başlayım;* **to put/to lay violent ~s on oneself** öz canına qəsd etmək, özünü öldürmək, intihar etmək; **a man of quick ~s** diribaş/cəld/zirək/əldən iti adam; **at/on any ~** hər halda, nə təhər olsa; **in the turning of a ~** *arx.* göz qırpımında, göz açıb yumana qədər, bir anda; *Satan finds mischief for idle hands to do Avaraçılığın axırı yoxdur/pis olur;* **not to move ~ or foot** əlini ağdan-qaraya vurmamaq; *Hands off! Əl/Əlinizi çək!/ çəkin!; Hands up! Əllər yuxarı! Təslim ol! / olun!*
◊ *A bird in the hand is worth two in the bush at. söz.* ≅ *Soğan olsun, nəqd olsun*

**hand**[2] [hænd] *adj* 1. əl, əllə düzəldilmiş; 2. qola bağlanan, qola taxılan; 3. əllə daşına bilən

**hand**[3] [hænd] *v* 1. vermək, ötürmək, təqdim etmək; **to ~ *smb.* a discharge** *d.d.* bir kəsi işdən azad etmək; *She was handed the prize for reading Bədii qiraət üçün ona mükafat verildi; Please hand me that book Lütfən o kitabı mənə ver/verin;* 2. kömək etmək *(minməyə, düşməyə); He handed his wife out of the railway carriage O, arvadının qatardan düşməsinə kömək etdi;* 3. *dən.* yelkəni yığmaq; **to ~ down** 1) yuxarıdan götürüb vermək; **to ~ down plates from the shelf** rəfdən boşqabları vermək; 2) nəsildən-nəslə ötürmək/vermək /qalmaq; *We cannot always observe the traditions handed down to us from the past Biz heç də həmişə keçmişdən bizə qalmış ənənələrə riayət edə bilmirik;* **to ~ down a legend** əfsanəni ağızdan-ağıza ötürmək; **to ~ in** 1) təqdim etmək, vermək; **to ~ in an application** ərizə vermək; 4. maşına minməyə /oturmağa / bir yerə keçməyə kömək etmək; **to ~ on** ötürmək, vermək, göndərmək; *Please hand on the magazine to your friends Lütfən bu jurnalı dostlarına göndər/göndərin;* **to ~ out** 1) paylamaq; *Blankets were handed out to the soldiers Yorğanlar əsgərlərə paylandı;* 2) xərcləmək, sərf etmək; *He is quite rich but he does not like to hand out Onun çoxlu pulu var, ancaq o, pulları xərcləməyi xoşlamır;* **to ~ over** vermək; rəsmən təqdim etmək; **to ~ over *one's* application to court** məhkəməyə rəsmən ərizə vermək; *You can't play with my gun – hand it over at once Mənim silahımla oynama/oynamayın - tez onu bəri ver/verin;* **to ~ round** hamıya paylamaq; *Hand round tea! Hamıya çay ver / verin;*
◊ **to ~ in *one's* checks** həyatla haqq-hesabını çürütmək, ölmək; **to ~ to *smb.*** məğlubiyyətini etiraf etmək, təslim olmaq

**hand-arms** ['hænda:mz] *n hərb.* şəxsi silah

**hand-bag** ['hændbæg] *n* 1. qadın əl çantası/sumkası; 2. yüngül əl çamadanı; 3. yol çantası

**handball** ['hændbɔ:l] *n id.* həndbol, əl topu

**handballer** ['hænd.bɔ:lər] *n* həndbolçu, həndbol oyunçusu

**hand-barrow** ['hænd.bærou] *n* 1. xərək; 2. əl arabası

**handbell** ['hændbel] *n* zəng, zınqırov

**handbill** ['hændbɪl] *n* I 1. reklam vərəqəsi; afişa; elan; 2. *hüq.* yazılı öhdəçilik

**handbill** ['hændbɪl] *n* II *k.t.* balaca bağ bıçağı

**handbook** ['hændbuk] *n* 1. məlumat kitabçası; 2. turistlər üçün məlumat kitabçası

**hand-brace** ['hændbreɪs] *n* əl burğusu, matqab

**hand-brake** ['hændbreɪk] *n* əl tormozu/əyləci

**hand-car** ['hænd.ka:r] *n d.y.* əl drezinası *(rels üstündə əllə hərəkətə gətirilən dördçarxlı araba və ya kiçik platforma)*

**hand-cart** ['hændka:t] *n* əl arabası

**handcuff**[1] ['hændkʌf] *n həm. pl* əl qandalı

**handcuff**[2] ['hændkʌf] *v* qandallamaq

**handfast**[1] ['hændfa:st] *n arx.* 1. sövdə kəsmə *(saziş bağlanarkən, sövdələşmə baş tutanda və s.);* 2. nişanlanma; nikah sazişi / müqaviləsi

**handfast**[2] ['hændfa:st] *adj arx.* 1. nişanlanmış, adaxlanmış; nişanlı, adaxlı; 2. xəsis, simic, dargöz, gözüdar, əlibərk

**handfast**[3] ['hændfa:st] *v arx.* nişanlamaq, nişan qoymaq, adaxlamaq

**handful** ['hæn(d)ful] *n* 1. ovuc, bir ovuc; **a ~ of nuts** bir ovuc fındıq; 2. çox az say, azca, bir az; *A handful of soldiers was left Bir az əsgər qalmışdı;* 3. *məc.* bələ, başağrısı; *That child is a*

*handful Bu uşaq əsl bəladır, Bu uşaq lap baş-ağrısıdır*
**hand-glass** ['hændgla:s] *n* lupa, zərrəbin, optik cihaz; 2. dəstəkli əl güzgüsü
**hand-grenade** ['hænd.grıneıd] *n* 1. əl bombası; 2. ədsöndürən
**handgrip** ['hændgrıp] *n* 1. əl sıxma, əl vermə; 2. əlbəyaxa vuruşma; **to come to ~** əlbəyaxa olmaq/vuruşmaq/ dalaşmaq
**handhold** ['hændhould] *n* 1. dayaq, istinad, ilişkə, tutacaq yeri; *There was neither handhold nor foothold on those steep rocks Bu yalçın qayalarda nə əl, nə də ayaq ilişdirməyə bir ilişkə var idi;* 2. dəstək, tutacaq, sap
**handicap[1]** ['hændıkæp] *n* 1. *id.* handikap *(idman yarışlarında zəif oyunçuları güclülərlə tənləşdirmək üçün onlara verilən müxtəlif güzəştlər)*; 2. cıdır, at yarışı; maneələri dəf etməklə keçirilən digər idman yarışları; 3. dərə-təpəlik yerdə avtomobil yarışı; 4. handikap *(qədim kart oyunu)*; 5. maneə, əngəl; **~ time** vaxt çatışmazlığı; **to overcome a ~** maneəni dəf etmək; **to be under a heavy ~** olduqca ağır vəziyyətdə olmaq
**handicap[2]** ['hændıkæp] *v* 1. *id.* müvəffəqiyyət qazanmaq üçün imkan vermək, bərabərləşdirmək; 2. əngəl/mane olmaq; *His short-sightedness seriously handicapped his studies Göz zəifliyi onun təhsilinə ciddi mane olurdu*
**handicapped** ['hændıkæpt] *adj* şikəst; **~ children** şikəst uşaqlar
**handicapper** ['hændıkæpə^r] *n* handikapər *(cıdır yarışı hakimi)*
**handicraft[1]** ['hændıkra:ft] *n* 1. sənət, peşə; əl işi; 2. mahirlik, qabiliyyət, ustalıq, sənətkarın ustalığı
**handicraft[2]** ['hændıkra:ft] *adj* 1. mahir, məharətli, qabil, bacarıqlı, usta; 2. kustar, əldəqayırma, əldə düzəldilmiş
**handicraftsman** ['hændı.kra:ftsmən] *n (pl* **-men** [mən]) sənətkar, peşəkar, əsnaf
**handie-talkie** ['hændı'tɔ:kı] *n d.d.* portativ radiostansiya *(hərəkət zamanı ayaqüstü əlaqə saxlamaq üçün)*
**handiwork** ['hændıwə:k] *n* 1. əl işi; 2. əllə işlənmiş məmulat/şey; *All this collection was his handiwork Bütün bu kolleksiya onun əl işləridir*
**handkerchief** ['hæŋkətʃıf] *n* 1. cib dəsmalı, əl yaylığı; 2. ləçək, çarqat, boyun ləçəyi;
◊ **to throw the ~ to** *smb.* 1) bir kəsə işarə etmək/vurmaq *(oyunlarda)*; 2) bir kəsi üstün tutmaq; **~ head** *amer.* yaltaq zənci; zəncilərin mənafeyinə xəyanət edən dönük
**hand-language** ['hænd.læŋgwıdʒ] *n* korlar üçün əlifba
**handle[1]** ['hændl] *n* 1. dəstək, qulp, sap, tutacaq; **the ~ of a knife** bıçağın sapı; **the ~ of an axe** baltanın sapı; **the ~ of a door** qapının dəstəyi; 2. bəhanə, fürsət, girəvə; *məc.* əl yeri; **to give/to leave a ~ to / for** *smth.* əlinə bəhanə/fürsət vermək; *You are leaving a handle against you Sən /Siz məzəmmət üçün onun əlinə bəhanə / fürsət verirsən / verirsiniz; Your indiscreet behaviour may give your enemies a handle against you Sənin /Sizin nəzakətsiz davranışın/davranışınız düşmənlərinin /düşmənlərinizin əlinə bəhanə verə bilər;*
◊ **the ~ of the face** *zaraf.* burun; **a ~ to one's name** titul, rütbə, fəxri ad; **to use the long ~ with/to** *smb.* bir kəslə çox sərt rəftar etmək; **to fly off the ~** özündən çıxmaq, cin atına minmək; **up to the ~** dəqiq, tam, lap, tam vaxtında
**handle[2]** ['hændl] *v* I saplamaq, sap salmaq, qulp qoymaq/salmaq
**handle** ['hændl] *v* II 1. rəftar etmək; *He is ill handled Onunla pis rəftar edirlər;* 2. qulluq etmək *(avtomobilə, mal-qaraya və s.)*; 3. əli ilə toxunmaq, əlində tutmaq; **to ~ a book with dirty hands** çirkli əllə kitabı götürmək; *Chlorine is a dangerous stuff to handle Xlora toxunmaq çox qorxuludur;* 4. idarə etmək, tənzimləmək; **to ~ a tractor** traktoru idarə etmək; **to ~ the traffic** küçə hərəkətini tənzimləmək; 5. əlaqəsi/işi olmaq; **to ~ documents** sənədləri qaydaya/ sahmana salmaq; 6. *amer.* alver etmək, satmaq; *What goods do you handle? Hansı malları alıb satırsan?;*
◊ **to ~ without gloves/mittens** çox sərt rəftar etmək ≅ qoz qabığına soxmaq
**handle-bar** ['hændlba:] *n* velosiped sükanı / rulu
**handling** ['hændlıŋ] *n* 1. rəftar; **rough ~** kobud /qaba rəftar; **delicate ~** incə rəftar; 2. xidmət / istismar tərzi; **to understand the ~ of the car** maşın sürməyi bacarmaq; 3. traktovka, izah, şərh; araşdırma, izah/şərh etmə, müzakirə; 4. tənzimləmə; **~ of traffic** küçə hərəkətini tənzimləmə; 5. yerbəyer etmə, yerbəyer edilmə; **~ of men** işçi qüvvəsinin yerbəyer edilməsi
**hand-made** ['hænd'meıd] *adj* əl işi, əldə düzəldilmiş
**handmaid[1]** ['hændmeıd] *n* qulluqçu qadın, xadimə
**hand-me-down[1]** ['hændmı'daun] *n* 1. *amer.* ucuz hazır don; 2. nimdaş geyim/ paltar
**hand-me-down[2]** ['hændmı'daun] *adj* 1. hazır; 2. ucuz; 3. nimdaş, geyilmiş *(paltar, geyim haq.)*
**hand-mill** ['hændmıl] *n* əl dəyirmanı
**hand-operated** ['hænd'ɔpəreıtıd] *adj* əllə idarə olunan / edilən
**hand-organ** ['hænd.ɔ:gən] *n* şarmanka *(çiyində gəzdirilən kiçik orqan, musiqi aləti)*
**handout** ['hændaut] *n* I *amer. d.d.* sədəqə, ehsan
**handout** ['hændaut] *n* II mətbuata / çapa veriləcək bəyanatın mətni
**hand-picked** ['hændpıkt] *adj* 1. əllə seçilmiş/ayrılmış; **~ jury** məxsusən seçilmiş prisyajnılar / andlılar heyəti *(ictimaiyyət tərəfindən seçilmiş*



*məhkəmə iclasçıları)*; 2. əllə çeşidlənmiş; 3. əllə dərilmiş / yığılmış *(meyvə, tərəvəz və s.)*
**hand-play** ['hændpleı] *n* qarşılıqlı zərbələr, dava-dalaş; əl oynatma, jest
**hand-rail** ['hændreıl] *n* sürahi, məhəccər; tutacaq
**hand-saw** ['hændsɔ:] *n* 1. əl mişarı/bıçqısı; 2. dəmirkəsən əl mişarı
**handsel[1]** ['hændsəl] *n* 1. hədiyyə *(xüs. təzə il üçün)*; 2. siftə, ticarətin başlaması; **to give ~** siftə etmək/vermək *(ticarətdə)*; 3. *arx.* beh, girov; **~ Monday** ilin ilk bazar-ertəsi / düşənbəsi
**handsel[2]** ['hænsəl] *v* 1. hədiyyə vermək; 2. təzələmək; açılışı təntənə ilə qeyd etmək; təntənə ilə açmaq; 3. ilk dəfə sınamaq, başlamaq
**handsome** ['hænsəm] *adj* 1. gözəl *(xüs. kişi, at, bina və s. haq.)*, boylu-buxunlu, qədd-qamətli, təndürüst/sərrast bədənli; əzəmətli; *What a handsome horse you have! Nə gözəl atın/atınız var!; He is as handsome as a young Greek god O, gənc yunan ilahisi kimi gözəldir;* **a ~ woman** boylu-buxunlu / qədd-qamətli qadın; **a ~ building** əzəmətli bina; *What a handsome old building it is! Bu nə əzəmətli qədim binadır!;* **to grow ~** gözəlləşmək, qəşəngləşmək; 2. böyük, çoxlu, xeyli, əməlli-başlı; **to make a ~ fortune** əməlli-başlı/böyük var-dövlət yığmaq/toplamaq; 3. səxavətli, əliaçıq, mərd, alicənab; *It is very handsome of you Sən/Siz çox alicənabsan/ alicənabsınız;*
◊ *Handsome is that / as handsome does at. söz.* ≅ *Əməli gözəl olan gözəldir, Adam sözünə görə yox, əməlinə görə gözəldir*
**handspike** ['hændspaık] *n* darvazanı döndərmək üçün qol/ling
**hand-to-hand** ['hændtə'hænd] *adj* əlbəyaxa; **~ combat** əlbəyaxa döyüş; **~ fight** əlbəyaxa vuruş / dava
**handwork** ['hændwə:k] *n* əl işi
**handwraps** ['hændræps] *n pl* əl binti / sarğısı *(boksda)*
**handwriting** ['hænd.raıtıŋ] *n* 1. xətt; **in one's own ~** öz əlilə/öz dəst-xəttilə yazılmış; 2. *d.d.* əlyazma
**handy** ['hændı] *adj* 1. cəld, diribaş, zirək, çevik, bacarıqlı, mahir; **to be ~ at** *smth.*, **to be ~ in / at doing** *smth.* bir şeyi etməyi bacarmaq, bir şeyi etməkdə mahir olmaq; *She is handy with needle O tikməkdə mahirdir; He is handy in the house O, ev işlərində zirəkdir, O, evdə hər işi görə bilir;* 2. rahat, əlverişli, gərəkli, əlyatımlı; *The car is very handy Bu maşın çox rahatdır, Bu maşın çox rahat idarə olunur; A good tool-box is a handy thing to have in the house Yaxşı alət qutusunun evdə olması çox əlverişli şeydir; Don't throw that plastic bag away; it may come in handy O plastik torbanı atma/atmayın, o, gərəkli ola bilər;* 3. yaxın, əlinin altında; **to keep** *smth.* **~** bir şeyi əlinin altında/yaxında saxlamaq; *The post office is handy Poçt lap yaxındadır, Əlini uzatsan poçta çatar;*
◊ **to come in ~** yerinə düşmək, yerində olmaq; *That would come in very handy Bu lap yerinə düşərdi*
**handy-dandy** ['hændı'dændı] *n* uşaq oyunu *"Tap görüm hansı əlimdədir!" (gizlədilən əşyanın sağ və ya sol əldə olmasını tapma)*
**handy-man** ['hændımən] *n (pl* **-men**[-mən]) 1. əlindən hər iş gələn adam, əlləri qızıl adam; 2. tez-tez lazım olan adam, həmişə gərəkli adam; 3. *d.d.* dənizçi
**hang[1]** [hæŋ] *n* 1. görünüş, tövr, cür, asılma / oturma tərzi; *Mark the hang of the dress Paltarın necə oturmasına diqqət yetir/yetirin; Do you like the hang of the curtains? Pərdələrin bu cür asılması xoşuna/xoşunuza gəlirmi?* 2. *d.d.* məna, ümumi məna, xüsusiyyət; *I don't get the hang of your argument Mən sənin / sizin dəlillərinin/dəlillərinizin məntiqini anlamıram;* 3. eniş, yamac, meyl, dağın döşü; **the south-west ~ of the hill** təpənin cənubi-qərb döşü / yamacı;
◊ **to get/to see the ~ of** *smth.* bir şey başa düşmək/anlamaq; bir şeyə alışmaq; *I have been trying to get the hang of this new electric type-writer Mən uzun müddətdir çalışıram ki, bu yeni elektrik yazı makinasının necə işlədiyini anlayım/öyrənim;* **to get the ~ of** *smb.* 1) bir kəsi anlamaq/yaxşıca tanımaq; 2) *məc.* dişə vurmaq, sınayıb bələd olmaq; **not to care a ~** etinasız/saymazyana olmaq, fərq qoymamaq; *I don't care a hang Mənim üçün heç fərqi yoxdur*
**hang[2]** [hæŋ] *v* I *(pt, pp* **hung**) 1. asmaq, sərmək *(paltarı)*, sallatmaq; **to ~ one's hat / coat on a peg** papağını/paltosunu asılqandan asmaq; *She hung the washing out in the garden O, camaşırları / yuyulmuş paltarları bağçada sərdi; The dog hung its ears İt qulaqlarını sallatdı;* 2. asılmaq, sallanmaq; *Her portrait hangs over the mantelpiece Onun portreti buxarının üstündən asılıdır; Her hair was hanging down her back Onun saçları kürəyinə dağılmışdı; Monkeys hang by the tail Meymunlar quyruqları ilə sallanırlar;* 3. sallanmaq, üstünü almaq, çökmək, hakim kəsilmək; *A cloud was hanging over the mountain peak Bulud dağ zirvəsinin üstündən asılmışdı; Sleep hung on his eyelids Onun gözlərindən yuxu tökülürdü;* 4. təhlükə altına almaq, hədələmək, *məc.* başının üstünü almaq; *A great disaster is hung over him Onun başının üstündə böyük bir fəlakət var; O, böyük bir fəlakət qarşısındadır;* 5. gen olmaq, yellənmək; **to ~ loose** sallanmaq, yellənmək; *His coat hangs on him Paltosu ona gendir;* 6. süzmək *(havada)*, havadan asılmaq; *The eagles are hanging in the air Qartallar havada süzürlər;* 7. qayırmaq, bərkitmək, yapışdırmaq; **to ~ wall paper** divar kağızı yapışdırmaq; **to ~ a door** qapı asmaq/sal-

maq; *The door is well hung Qapı yaxşı salınıb;* **8.** asıb saxlamaq; *Hares and pheasants need to be well hung Dovşanları və qırqovulları yaxşı-yaxşı asıb saxlamaq lazımdır (yemək üçün yararlı olana qədər); How long has this meat hung for? Bu ət nə vaxtdan asılıb?;* **9.** oturmaq, durmaq *(paltar haq.); I don't like the way her coat hangs Onun paltosunun durmasından mənim xoşum gəlmir;* **to ~ about 1)** dövrələmək, dövrəyə/araya almaq, toplaşmaq; *The children hung about their mother Uşaqlar analarını dövrəyə almışdılar;* **2)** boş-boş gəzmək, avaralanmaq, veyllənmək, küçələri ölçmək, sülənmək; *He hung about the park O, parkda avaralanırdı;* **3)** qorxusu / təhlükəsi olmaq; **4)** *məc.* qorxu/təhlükə yaratmaq; *There is thunder hanging about Havada ildırım qorxusu var; Rain is hanging about İndicə / Elə bu saat yağış yağacaq; My cold still hangs about me Zökəm/Tumov hələ də məndən əl çəkmir;* **to ~ back /behind 1)** həvəsi olmamaq; **2)** geri/dala qalmaq; **3)** cürət etməmək, qorxaqlıq göstərmək; *When volunteers were asked for, not one man hung back İşə könüllülər istəniləndə heç kim boyun qaçırmadı;* **to ~ down** sallanmaq; **to ~ on 1)** söykənmək, dirənmək; yapışmaq, tutmaq, tutub durmaq; *Help! I can't hang on any longer Kömək et!/edin! Daha dayana bilmirəm;* **2)** asılı olmaq; *Everything hangs on your answer Hər şey sənin / sizin cavabından / cavabınızdan asılıdır;* **3)** inadla davam etdirmək, sadiq qalmaq; *Your task is difficult but you must hang on till it is down Sənin/Sizin tapşırığın/tapşırığınız çətindir, ancaq sən / siz onu inadla davam etdirib həllinə nail olmalısan / olmalısınız;* **4)** buraxmamaq, bir addım da aralanmamaq; *He has hung on (to) me all day O, bütün günü məndən bir addım da aralanmayıb;* **to ~ out 1)** çıxarmaq; *The dog hung out its tongue İt dilini bayıra çıxartdı;* **2)** asmaq; **to ~ out a flag** bayraq asmaq; **3)** *d.d.* yaşamaq; *Where do you hang out? Harda yaşayırsan? / yaşayırsınız?;* **to ~ together 1)** bir-birinə dayaq olmaq, birlikdə olmaq, sadiq / sədaqətli / vəfalı olmaq; *If we all hang together, our plan will succeed Əgər biz birlikdə olsaq, planımız uğur qazanacaq;* **2)** uyğun gəlmək; məntiqi /ardıcıl olmaq; *The parts hang well together Hissələr bir-birinə yaxşı uyğun gəlirlər;* **to ~ up 1)** asmaq *(asılqandan və s.)*; **2)** süründürməyə salmaq, uzatmaq; **3)** telefon dəstəyini asmaq, rabitəni qapamaq, telefon danışığını kəsmək; **to ~ with 1)** bəzəmək *(şəkillərlə, bayraqla və s.)*; **to ~ walls with pictures** divarları şəkillərlə bəzəmək; **2)** *d.d.* örtmək, bürümək; *The trees are thickly hung with fruit Ağaclar meyvələrin ağırlığından əyilmişdi;*

◊ **to ~ by a thread, to ~ by a (single) hair** tükdən asılı olmaq; **to ~ in doubt** şübhə içində olmaq/boğulmaq; **to ~ on smb.'s sleeve** bir kəsdən asılı olmaq; **to ~ one's head** başını aşağı salmaq, xəcalət çəkmək, utanmaq; **to ~ on like grim death** möhkəm/bərk yapışmaq, yapışıb buraxmamaq; **to ~ upon smb.'s lips/ words** bir kəsə çox diqqətlə qulaq asmaq, qulağını bir kəsin ağzına dikmək; **to ~ up one's sword/ gun** əl çəkmək *(bir işdən)*, buraxmaq, tərgitmək, daşını atmaq; **to ~ up one's hat 1)** köç salmaq, uzun müddət qalmaq; **2)** toydan sonra köçüb arvadın evində yaşamaq; **to ~ heavy** dabanından daş asılmaq, uzanmaq, asta-asta getmək *(vaxt haq.)*; **to ~ on / by the eyelids 1)** tükdən asılı olmaq; çox ümidsiz olmaq; **2)** yarımçıq qalmaq; **to ~ on by one's eyelashes / one's eyebrows 1)** təkidlə tələb etmək; **2)** fəlakət/ölüm qarşısında olmaq; **to ~ in the balance** şübhə/tərəddüd etmək, qərarsızlıq göstərmək; **to ~ a leg/the groin** bir şey etməyə həvəsi olmamaq; **to ~ fire 1)** sürəkli atəş açmaq; **2)** açılmamaq *(tüfəng haq.); Let it go hang! Qoy cəhənnəm olsun! Qoy rədd olub getsin! If he doesn't like it he can go hang! Xoşu gəlmirsə, qoy rədd olub getsin!; Hang it all! Lənətə gəlsin!*

**hang** [hæŋ] *v* II *(pt, pp* **hanged***)* asmaq, edam etmək; **to ~ smb. for murder** bir kəsi qətlə görə edam etmək/asmaq; **to ~ by the neck** boğazından asaraq edam etmək; *He deserves to hang for it Buna görə onu asmaq lazımdır; He said he would hang himself O dedi ki, özünü asacaq;*

◊ *Beef, sir, is hung but men are hanged Malı öldürüb asırlar, insanları isə diri asıb öldürürlər; As well be hanged for a sheep as for a lamb* ≅ *Ölmək ölməkdir, xırıldamaq nə deməkdir*

**hangar** ['hæŋə$^r$] *n* **1.** *av.* anqar; **2.** mərək, anbar

**hangbird** ['hæŋbə:d] *n zool.* sarıköynək, sarısəndəl, zərd *(quş)*

**hangdog** ['hæŋdɔg] *n* dar ağacından asılmağa layiq, yaramaz / alçaq / rəzil / əclaf adam

**hanger** ['hæŋə$^r$] *n* **1.** *sərgidə nümayiş etdiriləcək şəkilləri seçmək üçün yaradılmış münsiflər heyətinin üzvü;* **2.** cəllad, edamı icra edən şəxs; **3.** qarmaq; **4.** asılqan; **5.** asılan şey *(pərdə, kəndir və s.)*; **6.** qarmaq, sırğa, tana

**hanger-on** ['hæŋər'ɔn] *n* **1.** *(pl* **hangers-on** ['hæŋəz'ɔn] **1.** müftəxor, qab dibi yalayan /özgə hesabına yaşayan adam; **2.** zəhlətökən / zəhləndə / qarayaxan adam

**hanging[1]** ['hæŋıŋ] *n* **1.** asma, asılma, sallanma; **2.** *hüq.* edam etmə, asılmaqla ölüm cəzası; *There were three hangings here last month Keçən ay burada üç adam edam olundu;* **3.** *pl* pərdə; **4.** divar kağızı;

◊ **~ matter** ≅ *Bu işdən ölüm qoxusu gəlir, Bu işə görə adamı asarlar*

**hanging[2]** ['hæŋıŋ] *adj* **1.** asılan, asılı, asma, sallaq; **~ bridge** asma körpü; **heavy ~ brows** qalın sallaq qaşlar; **2.** *d.d.* dəhşətli, eybəcər, çirkin, mənfur; *What a hanging face! Bu nə eybəcər sifətdir!*



**hang-man** ['hæŋmən] *n (pl* **~men** [-mən]) cəllad

**hang-nail** ['hæŋneıl] *n* **1.** *tib.* qaranquş, dırnaq mayası; **2.** tilişkə, qırıntı *(metalda)*

**hangout** ['hæŋ'aut] *n amer.* daimi toplanış / görüş yeri

**hang-over** ['hæŋ‚ouvə$^r$] *n* **1.** keçmişin qalığı; miras; **2.** *d.d.* xumarlıq, bərk sərxoşluqdan sonra süstləşmə

**hank[1]** [hæŋk] *n* **1.** *toxuc.* kələf, yumaq; **2.** *dən.* səliqə ilə burulub yığılmış buraz / kanat;

◊ **to have smb. at good ~** bir kəsi əldə saxlamaq, bir kəsin ipini əlində saxlamaq

**hank[2]** [hæŋk] *v* dolamaq, sarımaq

**hanker[1]** ['hæŋkə$^r$] *n* arzu, dilək, can atma

**hanker[2]** ['hæŋkə$^r$] *v* **(after, for)** ehtirasla/ çoşğunluqla/dəlicəsinə istəmək, susamaq, çox arzu etmək, həsrətində olmaq, həsrət çəkmək; **to ~ for travelling** səyahət arzusunda olmaq; **to ~ after the days of one's youth** əl çatmayan /itirilmiş gəncliyin həsrətini çəkmək; **to ~ after wealth** var-dövlət həsrətində olmaq, **to ~ about** boş-boşuna/avara-avara gəzmək, veyllənmək

**hankering** ['hæŋkərıŋ] *n* hərislik, can atma, meyl, həvəs; **to have ~ for smth.** bir şeyə can atma; **~ after power** hakimiyyət hərisliyi, hakimiyyətə can atma; **~ for stage** aktyor olmaq həvəsi

**hankie** ['hæŋkı] *n* = **hanky**

**hanky** ['hæŋkı] *n d.d.* cib dəsmalı, əl yaylığı

**hanky-panky** ['hæŋkı'pæŋkı] *n d.d.* yalan, yalan-palan, fırıldaq, hiyləgərlik, adam aldatma, dələduzluq; **to play ~ with smb.** bir kəsə fırıldaq gəlmək; *He is up to some hanky-panky O nə isə bir tələ qurur, O nə isə bir hiylə işlədir;* **~ business** ələltı/ şübhəli iş; **~ work** ikiüzlülük, riyakarlıq

**Hansard** ['hænsəd] *n* parlament iclasları haqqında rəsmi hesabat *(İngiltərədə)*

**hansom** ['hænsəm] *n (həm.* **cab** [-'kæb]) **1.** ikitəkərli fayton, minik arabası; **2.** *d.d.* taksi

**hap[1]** [hæp] *n arx.* olay; xoş təsadüf

**hap[2]** [hæp] *v arx.* baş vermək, olmaq, vaqe olmaq; **to ~ on smb.** bir kəslə təsadüfən rastlaşmaq; *I happed to do it Bunu etmək mənə nəsib oldu; It so happed İş belə gətirdi*

**haphazard[1]** ['hæp'hæzəd] *n* təsadüf; **by/at ~** təsadüfən, bəxtəbəxt, ağına-bozuna baxmadan

**haphazard[2]** ['hæp'hæzəd] *adj* təsadüfi, dalını-qabağını düşünməmiş, ağına-bozuna baxmamış, qarasına edilmiş, düşünülməmiş; **~ arrangement** düşünülməmiş tərtib; **to act/to choose in a ~ way** lazımınca düşünmədən hərəkət etmək

**haphazard[3]** ['hæp'hæzəd] *adv* təsadüfən, ağına-bozuna baxmadan; **to live ~** pozğun həyat sürmək

**haphazardly** ['hæp'hæzədlı] *adv* = **haphazard[3]**

**hapless** ['hæplıs] *adj şair.* bədbəxt, talesiz, uğursuz, başıbəlalı, qaragünlü

**haply** ['hæplı] *adv arx.* **1.** təsadüfən; **2.** ehtimal/olsun ki, bəlkə, ola bilsin/bilər ki

**happen** ['hæpən] *v* **1.** baş vermək, olmaq, vaqe olmaq; *What happened to your friend? Dostunun / Dostunuzun başına nə gəldi?; How did the accident happen? Hadisə necə baş verdi?; What happened next? Sonra nə oldu? / baş verdi?; If anything happens to him, let me know Əgər ona bir şey olsa, mənə xəbər ver / verin; Don't let it happen again! Yol vermə/verməyin ki, bu, bir də baş versin!; Just as if nothing had happened Elə bil ki, heç nə olmayıb / baş verməyib; Whatever happens Nə olsa belə; Happen what may Nə olursa-olsun, Nə olsa; If anything happens to me Başıma bir iş gələrsə,..., Əgər mən ölsəm;* **2.** aşkar/məlum olmaq *(təsadüfən)*; meydana çıxmaq; *The house happened to be empty Təsadüfən məlum oldu ki, ev boşdur; It so happened that I had no money with me İş elə gətirdi ki, üstümdə pulum olmadı; I happened to be out when he called İş elə gətirib ki, o mənə baş çəkəndə mən evdə olmamışam;* **3.** bəxti gətirmək, nəsib/müyəssər/müvəffəq olmaq; *I happened to have found the right words Bəxtim gətirdi ki, lazım olan sözləri seçməyə müvəffəq oldum;* **to ~ in** *d.d.* **1) (with)** rastlaşmaq, təsadüfən qarşılaşmaq; **to ~ in with an old schoolmate** təsadüfən köhnə məktəb yoldaşı ilə rastlaşmaq; **2)** *amer.* baş çəkmək, dəymək; **to ~ on/upon** rast gəlmək, qarşısına çıxmaq; *I happened on just the thing I'd been looking for Təsadüfən mən məhz çoxdan axtardığım bir şeyə rast gəldim; He happened upon a lost article O təsadüfən itmiş/unudulmuş məqaləyə rast gəldi;*

◊ *As it happens...* **1)** *İş/Məsələ burasındadır ki...;* **2)** təsadüfən; *As it happens, I have my cheque-book with me Təsadüfən çek kitabçası üstümdədir*

**happening** ['hæpnıŋ] *n* hadisə, qəziyyə, olay, əhvalat, vaqiə; **~s of the past year** ötən/keçən ilin hadisələri/olayları; *There have been strange happenings here lately Son vaxtlar burada qəribə əhvalatlar / hadisələr baş verib*

**happenstance** ['hæpnstæns] *n amer.* təsadüfi hadisə / əhvalat / olay

**happily** ['hæpılı] *adv* **1.** xoşbəxt, məsud, xoşbəxt /məsud halda, şən, xürrəm, sevincək, sevinə-sevinə, şadyanalıqla; **to live/to get on ~ together** xoşbəxt/məsud halda yaşamaq; **2.** xoşbəxtlikdən; *Happily, he did not die Xoşbəxtlikdən o ölmədi;* **3.** məqamında, müvəffəqiyyətlə, yaxşı, münasib, yerində; **a ~ expressed thought** yerində/məqamında ifadə olunmuş fikir

**happiness** ['hæpınıs] *n* **1.** xoşbəxtlik, səadət; **life of ~ and prosperity** ağ gün, firavanlıq; *His*

*happiness was so great that... Onun xoşbəxtliyi o qədər böyük idi ki,..*; **2**. uğur, müvəffəqiyyət, xoş təsadüf; **3**. vaxtlı-vaxtında olma, münasiblik, uyğunluq

**happy** [ˈhæpɪ] *adj* **1**. xoşbəxt, məsud, bəxtiyar; **a ~ man** xoşbəxt adam; *He is a very happy boy O çox xoşbəxt oğlandır*; **~ laughter / face / smile** məsud gülüş/çöhrə/təbəssüm; **~ tears** xoşbəxtlikdən axan göz yaşları; *He is happy in his son / daughter Oğul / Qız sarıdan onun bəxti gətirib; We don't feel quite happy about it Bu bizi narahat edir; I'm most happy that you consent Mən çox şadam ki, sən / siz razısan / razısınız; I'm happy to do it Mən bunu məmnuniyyətlə edərəm*; **2**. razı, xoşhal, məmnun; *He is happy at school O, məktəbdən çox razıdır*; **3**. uğurlu, müvəffəqiyyətli, yaxşı; **a ~ retort** uğurlu cavab; **~ circumstances** yaxşı şərait; *Their marriage has been a very happy one Onların nikahı çox uğurlu olmuşdur; The story has a happy ending Hekayə xoşbəxtliklə qurtarır/sonuclanır*;

◊ **the ~ mean** nə şiş yansın, nə kabab; **~ days 1**) pivə ilə eylin qarışığı *(içki növü)*; **2**) qəhbəxana, fahişəxana; **~ dispatch** *zaraf.* harakiri *(yapon samuraylarının qarnını xəncərlə yırtaraq özlərini öldürmə adəti)*; **to be as ~ as the day is long/as a king/as a sand-boy/as a bird on the tree** xoşbəxt/dərdsiz/qayğısız olmaq

**happy-go-lucky**[1] [ˈhæpɪgou.lʌkɪ] *adj d.d.* avara, veyl, arsız, qəmsiz; qayğısız, taleyin qisməti ilə razılaşan; **a ~ fellow** arsız cavan / oğlan/ cahil; **to live in a ~ way** dərdsiz-qəmsiz yaşamaq; **a ~ housewife** başısoyuq evdar qadın; *She goes through life in a happy-go-lucky fashion O, qayğısız həyat sürür, O, «qismət nədir, o olacaq» tərzilə həyat sürür*

**happy-go-lucky**[2] [ˈhæpɪgou.lʌkɪ] *adv d.d.* fikirləşmədən, düşünmədən, taleyin qismətilə; təsadüfən

**hara-kiri** [ˈhærəˈkɪrɪ] *n* harakiri *(yapon samuraylarının qarnını xəncərlə yırtaraq özünü öldürmə adəti)*

**harangue**[1] [həˈræŋ] *n* **1**. tənqid və təhqirlə dolu açıq nitq; **2**. odlu-alovlu /qızğın/ ehtiraslı müraciət; **3**. boşboğazlıq, lağlağılıq, naqqallıq

**harangue**[2] [həˈræŋ] *v* **1**. alovlu nitq söyləmək, hərarət və ehtirasla müraciət etmək; **2**. naqqallıq / boşboğazlıq etmək

**haranguer** [həˈræŋəʳ] *n* **1**. natiq; **2**. boşboğaz, naqqal

**haras** [ˈhærəs] *n* atçılıq /at zavodu

**harass** [ˈhærəs] *v* **1**. narahat/rahatsız etmək, üzmək, rahatlıq verməmək; *He was harassed by the cares of a large family Böyük bir ailənin qayğıları onu üzdü/ona rahatlıq vermədi*; **2**. taqətdən/əldən salmaq, çox yormaq; *The enemy harassed them Düşmən onları əldən salmışdı*; **3**. dəfələrlə/təkrarən hücum etmək; *In olden days the coasts of England were harassed by the Vikings Qədim zamanlarda İngiltərənin sahilləri dəfələrlə Vikinqlərin hücumlarına məruz qalmışdır*

**harbinger** [ˈha:bɪndʒəʳ] *n* müjdəçi, müjdə; *The swallow is the harbinger of spring Qaranquş baharın müjdəçisidir; The crowing of the cock is a harbinger of dawn Xoruzun banlaması sübhün açılmasının/dan yerinin sökülməsinin müjdəçisidir*

**harbor** [ˈha:bəʳ] *n amer.* = **harbour**[1]

**harbour**[1] [ˈha:bəʳ] *n* **1**. tərsanə, liman, port; **a natural ~** təbii liman; **to leave ~** lövbər qaldırmaq, yola düşmək; **to clear the ~** limanı tərk etmək; **2**. sığınacaq; qumarxana, tiryəkxana; yuva, məskən; **to give ~ to an escaped criminal** qaçmış cinayətkara sığınacaq vermək

**harbor** [ˈha:bəʳ] *v amer.* = **harbour**[2]

**harbour**[2] [ˈha:bəʳ] *v* **1**. lövbər salmaq *(limanda)*, limanda durmaq/dayanmaq; **2**. sığınacaq vermək, sığındırmaq, saxlamaq; **to ~ a spy** casusa sığınacaq vermək; *My dog has long, thick hair that harbours fleas Mənim itimin uzun qalın tükləri birə yuvasıdır*; **3**. kin bəsləmək; gizlətmək, məxfi saxlamaq *(qisas hissini və s.)*; **to ~ suspicions** şübhələrini büruzə verməmək / gizlətmək; **to ~ a grudge against *smb.*** bir kəsə qarşı kin bəsləmək /saxlamaq, qərəzli olmaq; **4**. *ovç.* güdmək, pusmaq, izləyib tapmaq

**harbourage** [ˈha:bərɪdʒ] *n* **1**. limanda gəmi dayanacağı; **2**. sığınacaq, yuva, məskən

**harbour-dues** [ˈha:bədju:z] *n pl* liman rüsumları

**harbour-master** [ˈha:bə.ma:stəʳ] *n* liman rəisi / kapitanı; liman müfəttişi

**hard**[1] [ha:d] *adj* **1**. bərk, sərt; **~ collar** kraxmallanmış / kraxmallı yaxalıq; **~ palate** *anat.* sərt damaq; **as ~ as rock** qaya / daş kimi sərt; **ground made ~ by frost** şaxtadan bərkimiş yer /torpaq; **to get / to grow ~** bərkimək, sərtləşmək; **2**. ağır, qəliz, cod, qara *(su haq.)*; **~ water** ağır/qara su; **~ silk** cod ipək; **3**. güclü, ağır; **~ blow** ağır/güclü zərbə; **4**. çətin, ağır, gərgin, müşkül; **~ work** ağır / gərgin iş; **~ labour** ağır zəhmət; **~ usage** gərgin/ağır istismar şəraiti; **a ~ supposition** ağlabatmayan güman/ehtimal; *It is hard to make up one's mind Qərara gəlmək çətindir; The hardest part of the job is done İşin ən çətin/ağır hissəsi yerinə yetirilib; The engine is hard to start Motor/Mühərrik çətinliklə/güclə işə düşür*; **a ~ problem/book/language** çətin problem /kitab/ dil; *That man is hard to please O kişini razı salmaq çətindir/müşkül işdir; It's hard for an old man to change his way of living Yaşlı adam üçün öz həyat tərzini dəyişmək çətindir; The disease is hard to cure Bu xəstəliyin müalicəsi çox çətindir; The child is hard to teach Bu uşağı öyrətmək çətindir*; **things ~ to imagine** təsəvvür edilməsi çətin olan şeylər, çətin təsəvvür edilən şeylər; **5**.





möhkəm, sağlam, bişmiş, bişkin, sınaqdan çıxmış; **~ muscles** möhkəm əzələlər; **in ~ condition** yaxşı idman formasında; **to get ~ by taking regular exercises** müntəzəm məşq etməklə fiziki cəhətdən möhkəmlənmək; *Regular physical exercises soon made the boys hard Müntəzəm fiziki məşqlər tezliklə oğlanları möhkəmləndirdi*; **6**. ciddi, qəti, amansız, rəhmsiz, zalım, qəddar; **~ bargain** ağır şərtli saziş/sövdə; **~ master** zalım sahibkar; **~ father** qəddar ata; **~ heart** rəhmsiz ürək; **7**. ağır, çətinliklərlə və məhrumiyyətlə dolu; **~ times** ağır zəmanə/vaxtlar; **~ year** ağır /məhrumiyyətlə dolu il; **~ life / lot / luck** acı tale / qismət / bəxt, fələk; *He has had hard luck Onun bəxti qara gəlib; In those hard times I lost my father O ağır vaxtlarda mən atamı itirdim;* **8**. sərt, bərk, şiddətli, soyuq; **~ climate** sərt iqlim; **~ frost** şiddətli şaxta; **~ winter** sərt qış; **9**. kəskin, sərt, qaba, kobud; **~ voice** kəskin səs; **~ eyes** sərt baxış; **~ words** ağır/kobud sözlər; **10**. çalışqan, səyli, işə canyandıran; **~ worker** çalışqan/işə canyandıran fəhlə; **to try *one's* ~est** bütün gücünü sərf etmək; **11**. həddini bilməyən/aşan, aludə; **a ~ drinker** əyyaş, içki düşkünü; **a ~ rider** yorulmaq bilməyən / usanmaz atlı/atsürən/süvari; **12**. mətin, dayanıqlı, səbatlı, yenilməz, möhkəm, dözümlü, sabit; **~ againts entreaties** xahişləri yerinə yetirməyən, xahişlərə məhəl qoymayan; **~ prices** sabit qiymətlər; **13**. xəsis, simic, acgöz, tamahkar, gözüdoymaz; **14**. tünd, spirtli; **~ liquors** spirtli likorlar; **15**. metal *(pul haq.)*; **~ money/cash** sikkə, metal pul; *amer.* nəqd pul; **16**. tez-tez vuran/döyünən *(nəbz haq.)*; güclü, pis *(öskürək haq.)*; **17**. kontrast; **~ image** kontrast təsvir *(TV haq.)*; **~ light** *fot.* güclü işıq; **~ negative** kontrastlı neqativ *(fotoqrafiya haq.)*; **18**. qatı, qəliz *(maye, duru maddə haq.)*; **~ fat** *tex.* qəliz sürtkü yağı; **19**. *fon.* qalın; **~ consonants** qalın samitlər; *The letter "c" is hard in the word "cat" "Cat" (pişik) sözündəki "c" səsi qalındır*;

◊ **~ labour** ağır/əzablı/məşəqqətli iş; katorqa; **~ of hearing** ağıreşidən; **~ nut** çətin / müşkül məsələ; **a ~ nut to crack 1**) həlli mümkün olmayan problem/məsələ; **2**) çətin/qəliz adam; **when ~ comes to hard** ən pis halda, bıçaq sümüyə dirənəndə; **~ and fast** möhkəm, etibarlı, sarsılmaz, pozulmaz; **~ and fast contract** etibarlı müqavilə; **~ as adamant** qranit kimi möhkəm; **~ as nails 1**) rəhmsiz, daşürəkli, sərt, vicdansız; **2**) dözümlü, dayanıqlı, səbatlı

**hard**[2] [ha:d] *adv* **1**. güclü, gərgin, qızğın, ciddi, ciddiyyətlə, cəhdlə, qızğın surətdə; **to run ~** bərk qaçmaq, dabanına tüpürmək; *It's raining hard Güclü yağış yağır*; **to pull ~** bərk dartmaq; **2**. inadla, təkidlə, israrla, möhkəm, ciddcəhdlə, səylə; **to be ~ at work on *smth.*** bir şey üzərində inadla/səylə işləmək; **to work ~** çox işləmək; **to look/to stare/to gaze ~** gözlərini zilləmək/dikmək, gözünü çəkməmək; **3**. bərk, möhkəm, bərk-bərk; **to hold ~** bərk-bərk tutmaq; **to boil eggs ~** yumurtaları bərk bişirmək; **4**. güclə, çətinliklə; **to earn money ~** çətinliklə çörəkpulu qazanmaq; **5**. həddən artıq, bərk, çox, daim; **to drink ~** çox bərk içmək, ayıq vaxtı olmamaq;

◊ **to be ~ on *smb.*** bir kəsə qarşı çox amansız olmaq; *Don't be too hard on me! Mənə qarşı belə amansız olma!/olmayın!*; **~ at hand** yaxın, çox yaxın, yanında; **to follow ~ after / behind / upon** addım-addım izləmək, dalınca düşmək; **~ upon** təxminən, təqribən, ...yaxın; **~ upon sixty** altmışa yaxın, təxminən altmış; *He is hard upon sixty Onun yaşı altmışa yaxın olar; It was hard upon twelve Təxminən saat on iki idi*; **to die ~** asanlıqla ölməmək; **to be ~ pressed for time/money** az vaxtı/pulu olmaq; **~ put for a livelihood** özünü oda-alova/oda-közə vurmaq/ atmaq, ehtiyac içində yaşamaq, balıq kimi çapalamaq; *It goes hard with him Onun işi fənadır, Onun işi Allaha qalıb*

**hardback** [ˈha:dbæk] *n* bərk/qalın cildli kitab

**hardbeam** [ˈha:dbi:m] *n bot.* vələs, ulas *(ağac)*

**hardboiled** [ˈha:dˈbɔɪld] *adj* **1**. bərk bişirilmiş *(yumurta haq)*; **2**. sərt, kobud, inadcıl; *amer. jarq.* ömründə çox şeylər görmüş

**hard currency** [ˈha:d.kʌrənsɪ] *n mal.* sərbəst dəyişdirilən/konvertə edilən valyuta /pul

**hard-earned** [ˈha:dˈə:nd] *adj* ağır zəhmətlə qazanılmış

**harden** [ˈha:dn] *v* **1**. bərkitmək, möhkəmləndirmək; **to ~ a bolt in its place** boltu yerinə bərkitmək; **2**. sağlamlaşdırmaq, alışdırmaq, davamlı/dözümlü etmək, öyrətmək, **3**. *məc.* bişirmək; **to ~ troops** ordunu davamlı/dözümlü etmək/bişirmək; **to ~ the body against cold** bədəni soyuğa alışdırmaq/öyrətmək; **to ~ to labour** əməyə alışdırmaq; *He hardened into a warrior O, bişmiş/dözümlü döyüşçü oldu*; **4**. daşürəkli/mərhəmətsiz etmək, sərtləşdirmək; **to ~ *one's* heart** daşürəkli olmaq; **to be ~ed in heart** amansız olmaq, ürəyi daşa dönmək; **5**. sabitləşmək *(qiymət haq.)*; *The market hardened Bazar sabitləşdi, Bazarda qiymətlər sabitləşdi*; **6**. su vermək *(polada)*; **to ~ steel** polada su vermək; **to ~ by heat** qızdırıb tab vermək; **7**. *tex.* sementləmək, sementlə bərkitmək;

◊ **to ~ the neck** *amer.* boynuyoğunluq etmək, boynunun yoğun yerinə salmaq, tabe olmamaq

**hardened** [ˈha:dnd] *adj* **1**. bərk, bərkimiş; **~ soap** bərk / quru sabun; **~ lava** sönmüş / bərkimiş lava; **2**. kök salmış/atmış, dəyişməz, möhkəm; **~ beliefs** kök salmış inamlar; **3**. daşürəkli, amansız; **~ heart** daşqəlb, daşürək; **4**. su verilmiş; **~ steel** su verilmiş polad

**hardener** [ˈha:dnəʳ] *n* **1**. aşqar, metalın möhkəm-

liyini təmin edən maddə, qarışıq; 2. *kim.* bərkidici reagent, bərkiməni sürətləndirən reagent; 3. *foto.* aşılayıcı maddə

**hardening** ['ha:dnıŋ] *n* 1. möhkəmləndirmə; 2. *tex.* smentasiya *(poladın və ya dəmirin səthinin karbonla möhkəmləndirilməsi)*; 3. şirələmə, minalama, cilalama, pardaxlama

**hard-faced** ['ha:d'feıst] *adj* sərt, amansız, rəhmsiz

**hard-favoured** ['ha:d'feıvəd] *adj* iyrənc, çirkin, çiyrəndirici xarici görkəmi olan

**hard-featured** ['ha:d'fi:tʃəd] *adj* kobud, sərt, qaba sifətli

**hard-fisted** ['ha:d'fıstıd] *adj* simic, xəsis, acgöz, tamahkar, əlibərk

**hard-fought** ['ha:d'fɔ:t] *adj hərb.* şiddətli, qızğın, inadlı *(döyüş)*

**hard-grained** ['ha:d'greınd] *adj* 1. iridənəli; 2. tərs, inad, yolagəlməz, ağır xasiyyətli

**hard-handed** ['ha:d'hændıd] *adj* 1. güclü, döyənəkli *(əl)*; 2. sərt, qəddar, müstəbid

**hardhead** ['ha:dhed] *n* 1. hiyləgər/bacarıqlı /qabiliyyətli/öz işini bilən adam; 2. gic/ axmaq/ qanmaz/ korazehin / küt adam

**hard-headed** ['ha:d'hedıd] *adj* 1. hiyləgər, sərhesab, qənaətcil, öz xeyrini bilən; **a ~ businessman** dünyagörmüş işbaz/biznesmen; 2. tərs, inadcıl

**hard-hearted** ['ha:d'ha:tıd] *adj* daşürəkli, amansız, rəhmsiz, mərhəmətsiz, sərt, hissiz

**hardihood** ['ha:dıhud] *n* 1. cürət, cəsarət, ürəklilik; 2. ədəbsizlik, qabalıq, kobudluq, həyasızlıq, sırtıqlıq; **to have the ~ to deny *smth.*** bir şeyi həyasızcasına inkar etmək

**hardily** ['ha:dılı] *adv* cəsarətlə, mərdliklə, kişi kimi, cəsuranə, cəsurluqla

**hardiness** ['ha:dınıs] *n* 1. dözümlülük, möhkəmlik, sağlamlıq; 2. həyasızlıq, ədəbsizlik, qabalıq, kobudluq

**hardly** ['ha:dlı] *adv* 1. ancaq-ancaq, ancaq, kimi; *He had hardly time enough Onun vaxtı ancaq çatdı; She is hardly twenty Onun iyirmi yaşı ancaq olar; Hardly we had got into the country when it began to rain Biz güclə kəndə çatmışdıq ki, yağış yağmağa başladı*; 2. çətin ki, çox çətin ki, çətin ola bilsin, güman ki; *It is hardly possible Çətin ki, bu mümkün olsun; He will hardly come now Çətin ki, indi o gəlsin; He can hardly have arrived yet Güman etmirəm ki, o artıq gəlmiş olsun;* 3. çətinliklə, güclə, zorla, güc-bəla ilə, zor-bəla ilə; *I could hardly understand him Mən onu güclə başa düşə bildim; I could hardly believe my eyes / my ears Mən güclə gözlərimə / qulaqlarıma inana bildim*; 4. kobud, kobudcasına, çox sərt, ədalətsiz, nahaqdan; *He was hardly treated Onunla çox sərt / kobud rəftar olundu*; **~ ever** çox nadir halda, demək olar ki, heç vaxt; *We hardly ever go to the cinema Biz demək olar ki, heç vaxt kinoya getmirik; We'll hardly ever meet him Güman etmirəm ki, biz bir də onunla görüşək*; **~...when** kimi, ki; *Hardly had she put on her dress when the door burst open O, paltarını yenicə geymişdi ki, qapı taybatay açıldı*

**hard-mouthed** ['ha:d'mauðd] *adj* 1. başıbərk *(at haq.)*; 2. özbaşına, öz bildiyini edən, tərs, inad, höcət

**hardness** ['ha:dnıs] *n* 1. bərklik, möhkəmlik; 2. sərtlik *(hava haq.)*; 3. codluq, ağırlıq *(su haq.)*

**hard-pan** ['ha:dpæn] *n geol.* 1. sərt torpaqaltı lay / təbəqə; 2. əsas xüsusiyyət / keyfiyyət; **the ~ of character** 1) xarakterin əsas xüsusiyyəti; 2) ən aşağı səviyyə /hədd; *Prices have reached hard-pan Qiymətlər ən aşağı səviyyəyə/həddə çatıb*

**hard-rubber** ['ha:d'rʌbə'] *n tex.* ebonit

**hards** [ha:dz] *n pl* 1. kilkə, lif, daraqağzı *(yun, kətan və s. darayarkən qalan tullantı)*; 2. daş kömür

**hardset** ['ha:d'set] *adj* çətin vəziyyətdə olan, müsibət / fəlakət içində olan

**hardshell** ['ha:dʃel] *adj* 1. sərt qınlı/qabıqlı; 2. möhkəm əqidəli, qatı, islaholunmaz, yekəbaş, danabaş, qalınqafa; **~ segregationists** qatı seqreqasiya (ayırma) tərəfdarları

**hardship** ['ha:dʃıp] *n* çətinlik, ağırlıq, əzab, əziyyət; qəm, qüssə, kədər; **to be/to get/ to become inured to ~s** çətinliklərə/ əzablara/əziyyətlərə dözməyi bacarmaq; *Doing this is no hardship Bunu etmək o qədər də çətin deyil*; 2. məhrumiyyət, ehtiyac, yoxsulluq; **a life of ~s** məhrumiyyətlərlə dolu həyat; **to go through / to bear/to suffer many ~s** çoxlu məhrumiyyətlərə dözmək/məruz qalmaq, çoxlu çətinliklərdən keçmək

**hard-tack** ['ha:dtæk] *n* suxarı, qalet *(peçenye növü)*

**hard up** ['ha:d'ʌp] *adj* pulsuz, pula böyük ehtiyacı olan; **~ for *smth.*** bir şeyə ehtiyacı olan; *He was hard up for something to say O bilmirdi, nə desin*

**hardware** ['ha:dweə'] *n* 1. dəmir məmulatı; 2. *amer. jarq.* spirtli içki

**hardwood** ['ha:dwud] *n* bərk ağac/oduncaq

**hardy**[1] ['ha:dı] *n* dəmirçi qələmi *(dəmir yonmaq üçün)*

**hardy**[2] ['ha:dı] *adj* 1. dözümlü, davamlı, bişmiş; **a ~ soldier** dözümlü / bişmiş əsgər; 2. şaxtaya /qışa dözümlü; **~ annuals** şaxtaya dözümlü birillik bitkilər; *A few hardy men broke the ice on the lake and had a swim Şaxtaya dözümlü bir neçə adam gölün üstündəki buzu qırıb çimdilər*; 3. cəsur, igid, cəsarətli, qoçaq, şücaətli; **~ attack** cəsarətli hücum; 4. ağılsız, düşüncəsiz, ehtiyatsız, özünə qürrələnən, lovğa; **a ~ denial of facts** faktların əsassız inkar edilməsi

**hare** [heə'] *n* 1. *zool.* dovşan; 2. *amer.* krolik, evdovşanı; 3. krolik xəzi / dərisi; 4. dovşan əti; 5. *d.d.* biletsiz *(sərnişin, tamaşaçı)*; ◊ **~ and hounds** 1) "dovşan və itlər" *(oyun)*; 2) kütləvi kross yarışı; **to make a ~ of *smb.*** bir kəsi gic/qanmaz yerinə qoymaq; **as timid as a ~** dovşan kimi qorxaq;

◊ **to run with the ~ and hunt with hounds** ikibaşlı oyun oynamaq, dovşana qaç, tazıya tut demək; *First catch your hare (then cook him) Çay gəlməmiş çırmanma*; ≅ *Cücəni payızda sayarlar*



**harebell** ['heəbel] *n bot.* zəngçiçəyi

**hare-brained** ['heəbreınd] *adj d.d.* dovşan ağılda, düşüncəsiz, yelbeyin, başıboş, yüngül, hərdəmxəyal

**harefoot** ['heəfut] *n* (*pl* **-feet** [-fi:t]) 1. uzunayaq, uzunayaqlı *(it haq.)*; 2. uzunayaq *(adam ayaması)*

**harelip** ['heə'lıp] *n* dovşandodaq, dodağı mırıq

**harem** ['heərem] *n* hərəm, hərəmxana

**hare's foot** ['heəzfut] *n bot.* yonca

**haricot** ['hærıkou] *n bot.* maş, paxla, lobya *(dəni)*

**hari-kari** ['ha:rı'ka:rı] *n* = **hara-kiri**

**hark**[1] [ha:k] *v şair.* 1. dinləmək, qulaq asmaq/vermək; *Let us hark to the song of the birds Gəl/Gəlin quşların nəğməsinə qulaq asaq*; 2. diqqət yetirmək, fikir vermək; *Hark you! Diqqət yetir!/yetirin!, Qulaş as! / asın!, Fikir ver! / verin!*

**hark**[2] [ha:k] *inter: ovç. Axtar! (itə verilən dilcavabı əmr / komanda)*; **~ back** *Geri! (itə verilən komanda); Hark on! İrəli! (itə verilən komanda)*

**harlequin**[1] ['ha:lıkwın] *n* 1. arlekin *(italyan xalq komediyasında nədim, təlxək)*

**harlequin**[2] ['ha:lıkwın] *adj* 1. burlesk *(komik təsvir)*; gülməli; 2. ala-bəzək, ala-bula, rəngbərəng, əlvan

**harlequinade** [.ha:lıkwı'neıd] *n* 1. arlekinada *(baş rolu təlxək oynayan tamaşa)*; 2. təlxəklik, nədimlik

**harlot** ['ha:lət] *n* fahişə, qəhbə; yava/gəzəyən qadın; **to play the ~** qəhbəlik etmək, fahişəliklə məşğul olmaq

**harlotry** ['ha:lətrı] *n* fahişəlik, qəhbəlik; əxlaqsızlıq, pozğunluq

**harm**[1] [ha:m] *n* 1. zərər, ziyan, xəsarət; **grievous bodily ~** *hüq.* ağır bədən xəsarəti; **to do (much) ~ to *smb./smth.*** bir kəsə / şeyə (böyük) ziyan vurmaq; *He probably meant no harm Ehtimal ki, o heç kəsin xətrinə/heysiyyətinə toxunmaq niyyətində olmayıb; A few drinks will do you no harm Bir az içki sənə / sizə heç bir ziyan verməz/olmaz*; **~ to the health** sağlamlığa ziyan; **~ done by the storm** tufanın vurduğu ziyan; 2. bəla, bədbəxtlik, müsibət, təhlükə; **to be safe from ~** təhlükədən uzaq olmaq, təhlükəsiz olmaq; **out of ~'s way** bəladan uzaq; **to keep *smb.* out of ~'s way** bir kəsi təhlükədən/bəladan qorumaq; **to protect *smb.* from ~** bir kəsi bəladan qorumaq; *There is no harm done Bundan heç kəsə ziyan dəyməz/olmaz; There is little harm in doing so Burada pis bir şey yoxdur*; 3. *arx.* qəm, qüssə, kədər

**harm**[2] ['ha:m] *v* ziyan vurmaq, zərər yetirmək /vermək; *It hasn't harmed you, has it? Bu sənə / sizə zərər yetirməyib, elə deyilmi?*; **to ~ *smb.*'s reputation** bir kəsi etibardan salmaq, bir kəsin adını ləkələmək; *He will not harm for it Bunun ona heç bir ziyanı olmaz*

**harmful** ['ha:mful] *adj* zərərli, ziyanlı, ziyankar, müzür; təhlükəli, fəlakətli; **~ consequences** təhlükəli nəticələr/fəsadlar; **~ news** həyəcanlı/qara xəbər; **~ animals** ziyankar/zərərli/ müzür heyvanlar

**harmfully** ['ha:mfulı] *adv* çox pis / zərərli, ziyankarcasına, yaman, iyrənc

**harmfulness** ['ha:mfulnıs] *n* ziyan, zərər, ziyanlılıq, zərərlilik; fəlakət

**harmless** ['ha:mlıs] *adj* 1. ziyansız, zərərsiz, təhlükəsiz; **~ drug** zərərsiz dərman; **~ snakes** ziyansız ilanlar; 2. fağır, sakit, günahsız, dinc; *Several harmless passers-by were killed Yoldan keçən bir neçə günahsız adam öldürüldü*; 3. sağ-salamat, salamat; **to save *smth.* ~** bir şeyi sağ-salamat qoruyub saxlamaq

**harmonic**[1] [ha:'mɔnık] *n* 1. *mus.* harmonik /həmahəng züy / əlavə səs; oberton *(əsas tona xüsusi rəng verən əlavə ton)*; 2. *fiz. riyaz.* harmonika

**harmonic**[2] [ha:'mɔnık] *adj* 1. harmonik, ahəngdar; 2. *mus.* məlahətli, melodik, harmoniya prinsiplərinə uyğun

**harmonica** [ha:'mɔnıkə] *n* qarmon *(musiqi aləti)*, akkordeon, dodaq qarmonu

**harmonious** [ha:'mounjəs] *adj* 1. harmonik, həmahəng, ahəngdar, uyğun; **~ sounds** həmahəng/ahəngdar səslər; **~ colours** uyğun rənglər; **a ~ group of buildings** tikililər ansamblı; 2. mehriban, səmimi, yekdil, dinc; **~ family** mehriban ailə; **~ neighbours** mehriban qonşular; **~ meeting** səmimi görüş; 3. melodik, lətif, xoşavaz, məlahətli; **~ songs** melodik/lətif/məlahətli mahnılar

**harmonist** ['ha:mənıst] *n* 1. musiqişünas, bəstəçi, bəstəkar; 2. *mus.* orkestrator *(musiqini orkestr üçün uyğunlaşdıran)*

**harmonium** [ha:'mounjəm] *n* fisqarmoniya *(körüklər vasitəsilə çalınan dilli musiqi aləti)*

**harmonize** ['ha:mənaız] *v* 1. uyğunlaşdırmaq, bir əndazəyə salmaq, aralarında uyğunluq yaratmaq; **to ~ hostile parties** düşmənçilik edən tərəfləri barışdırmaq; **to ~ *one's* aims and wishes with *one's* abilities** öz məqsəd və istəklərini imkanlarına uyğunlaşdırmaq; 2. uyğun olmaq / gəlmək, yaraşmaq, həmahəng olmaq; *Pink does not harmonize with red Çəhrayı rəng qırmızı rəngə uyğun gəlmir; His behaviour harmonizes with his character Onun davranışı xasiyyətinə uyğun gəlir; Their plans harmonize Onların*

*planları bir-birinə uyğun gəlir*; 3. əmin-amanlıq içində/dostluq şəraitində yaşamaq

**harmony** ['ha:mənı] *n* 1. *mus.* ahəng, harmoniya; xoşavazlıq, həmahənglik, uyğunluq; **the ~ of voices** səslərin həmahəngliyi; 2. uyğunluq, müvafiqlik, uzlaşma, münasiblik, bir əndazədə olma, yekdillik; **~ between form and substance** forma və məzmun uyğunluğu; *There was not much harmony in international affairs during those years O illərdə beynəlxalq münasibətlərdə o qədər də yekdillik olmamışdır; His tastes are in harmony with mine Onun zövqləri mənimkilərə uyğundur*; 3. əmin-amanlıq, dinclik; **to live in full/perfect ~** tam əmin-amanlıq içində/ səmimilik şəraitində yaşamaq

**harness**[1] ['ha:nıs] *n* 1. qoşqu ləvazimatı; qoşqu, yəhər-qayış; **to put a horse in ~, to put the ~ on a horse** atı qoşmaq *(furqona, kotana və s.)*; 2. ləvazimat, inventar, avadanlıq, yaraq-əsləhə; 3. *av.* paraşütün sallanma sistemi; 4. *av.* təhlükəsizlik kəməri *(pilotun)*; 5. *dən.* yelkən ipləri; ranqout, dor *(gəmi dirəkləri)* və gəminin kəndirləri;
◊ **in ~** gündəlik işlə məşğul olma; **to die in ~** iş başında ölmək; **double ~** *zaraf.* ər-arvadlıq; **to work / to run in double ~** *zaraf.* 1) kəbinli olmaq; 2) ortaqlı işləmək

**harness**[2] ['ha:nıs] *v* 1. qoşmaq; **to ~ a horse** at qoşmaq; **to ~ a horse to a carriage** atı faytona qoşmaq; 2. *məc.* cilovlamaq; fəth etmək; **to ~ a waterfall** şəlalədən elektrik enerjisi mənbəyi kimi istifadə etmək; 3. yaraq-əsləhəsini geymək

**harp**[1] [ha:p] *n* 1. arfa *(simli musiqi aləti)*; 2. **Harp** *astr.* Lira bürcü

**harp**[2] [ha:p] *v* 1. arfada çalmaq; 2.: **to ~ on / upon** daim təkrar etmək; **to ~ on *one's* successes** daim/həmişə öz uğurlarından danışmaq; *She is always harping on my faults O daima mənim suçlarımdan/ qüsurlarımdan danışır;* **to ~ on / upon the same string** eyni şeyi hey təkrar etmək, çürükçülük etmək; ≅ *Çevir tatı, vur tatı,* valı ilişmək

**harp-antenna** ['ha:pæn'tenə] *n rad.* yelpikvari antenna

**harper** ['ha:pə$^r$] *n* arfa çalan, arfist

**harpist** ['ha:pıst] *n* peşəkar arfist

**harpoon**[1] [ha:'pu:n] *n* harpun *(böyük dəniz heyvanlarını ovlamaq üçün nizə / qarmaq)*; dəstəkli qarmaq

**harpoon**[2] [ha:'pu:n] *v* harpunla vurmaq

**harpy** ['ha:pı] *n əs.* 1. harpiya *(yunan əsatirlərində tufan ilahəsi)*; 2. *məc.* vəhşi/ qəddar/yırtıcı/acgöz adam

**harquebus** ['ha:kwıbəs] *n* dayandoldurum tüfəng *(lüləsinin ağzından doldurulan qədim silah)*

**harridan** ['hærıdən] *n* qoca, əldən düşmüş qarı; küpəgirən / cadugər qarı

**harrier** ['hærıə$^r$] *n* I 1. tazı, ov iti; 2. *pl* ovçular və it sürüsü; 3. kross yarışının iştirakçısı

**harrier** ['hærıə$^r$] *n* II soyğunçu, qarətçi, talançı, çapqınçı, quldur, çapovulçu, yolkəsən

**harrow**[1] ['hærou] *n* 1.*k.t.* mala, dırmıq; 2. çəpinə yerləşdirmə / qurma;
◊ **under the ~** 1) işgəncə altında/ilə; 2) darda, dar gündə, ağır vəziyyətdə; **under the ~ of affliction** ağır dərd/qüssə/ kədər içərisində

**harrow**[2] ['hærou] *v* 1. malalamaq, dırmıqlamaq; 2. malalanmaq, dırmıxlanmaq; *The field harrows well Zəmi rahat dırmıqlanır*; 3. incitmək, əzab / əziyyət vermək, üzmək; **to ~ *smb.'s* feelings** 1) bir kəsin yarasını / dərdini təzələmək; 2) bir kəsə əzab-əziyyət vermək

**harry** ['hærı] *v* 1. qəfildən hücum /basqın etmək, soyub talamaq, viran/talan etmək, xaraba qoymaq; *The Vikings used to harry the English coast Vikinqlər İngiltərənin sahillərinə tez-tez qəfildən hücum edərdilər*; 2. narahat etmək, təngə gətirmək, bezikdirmək, zəhlə aparmaq, usandırmaq; *Fear harried him Qorxu onu usandırmışdı*; **to ~ *smb.* to death** bir kəsə öləndək əzab / işgəncə vermək

**harsh** [ha:ʃ] *adj* 1. kobud, nahamar, cod, qaba; **a ~ texture** cod parça; **a ~ voice** kobud səs; **~ surface** cod / nahamar səth; 2. sərt, xoşagəlməz, şiddətli, tünd, acı; **~ climate** sərt iqlim; **~ wind** şiddətli külək; **~ to the taste** tünd və acı dad; **~ smoke** acı tüstü; **~ words** nalayiq sözlər; 3. ciddi, zabitəli, tələbkar, acıqlı, acı; **a ~ parent** ciddi /zabitəli /tələbkar valideyn; **a ~ face** acıqlı / qaşqabaqlı/ciddi sifət; **~ truth** acı həqiqət; **to be ~ to *smb.*** bir kəsə qarşı ciddi olmaq

**harshly** ['ha:ʃlı] *adv* kobud, qaba, sərt, ciddi, kobudcasına, qabacasına

**harshness** ['ha:ʃnıs] *n* sərtlik, qabalıq, kobudluq, ciddilik, kəskinlik

**harslet** ['ha:slıt] *n* = **haslet**

**hart** [ha:t] *n* erkək maral *(beş yaşı ötmüş)*

**hartshorn** ['ha:tshɔ:n] *n* 1. maral buynuzu; 2. *kim.* naşatır spirti, ammonium-hidroksid; 3. burun tozu *(xüs. duzdan hazırlanmış)*

**harum-scarum** ['heərəm'skeərəm] *adj d.d.* yüngül, başıboş, yelbeyin, hərdəmxəyal, arsız; **~ conduct** yüngül / arsız davranış / əxlaq; **~ fellow** arsız/hərdəmxəyal oğlan

**harum-scarum** ['heərəm'skeərəm] *adv* necə gəldi, gözüyumulu, gözünü yumub

**harvest**[1] ['ha:vıst] *n* 1. məhsul yığımı, biçin, yığım, taxıl yığımı; **wheat ~** taxıl/ buğda biçini / yığımı; 2. məhsul, bəhrə; **wheat ~** taxıl məhsulu; **an ample/abundant /rich /bounteous ~** bol/çox məhsul; **a poor / scanty ~** az/qıt/zəif məhsul; *The harvest is ripe Məhsul yetişib/dəyib*; **to reap the ~** yetişmiş məhsulu yığmaq, taxılı biçmək; **to gather/to get in the ~** məhsulu yığmaq/toplamaq; 3. *məc.* bəhər, səmərə, nəticə; **to reap the ~ of *one's* labour** öz zəhmətinin bəhrəsini / səmərəsini görmək; 4. məhsul dövrü / mövsümü / zamanı



**harvest**[2] ['ha:vıst] *v* 1. yığmaq, toplamaq, dərmək, biçmək; **to ~ wheat** taxılı yığmaq/biçib toplamaq; **to ~ potatoes** kartofu çıxartmaq/yığmaq; 2. *məc.* bəhrəsini/ səmərəsini / nəticəsini görmək; **to ~ the fruit of *one's* evil acts** öz bəd əməllərinin nəticəsini görmək

**harvester** ['ha:vıstə$^r$] *n* 1. biçinçi; 2. *k.t.* məhsul toplayan maşın, kombayn, biçin maşını

**harvester-stacker** ['ha:vıstə'stækə$^r$] *n k.t.* qotman *(dərz/ot qalağı, taya)* vuran maşın

**harvester-thresher** ['ha:vıstə'θreʃə$^r$] *n* taxılyığan kombayn

**harvest-field** ['ha:vıstfi:ld] *n* taxıl zəmisi / tarlası

**harvest-home** ['ha:vıst'houm] *n* 1. biçinin sonu, məhsul yığımının başa çatması; 2. *arx.* məhsul bayramı; 3. biçinçi mahnısı/ nəğməsi, məhsul təranəsi

**harvesting** ['ha:vıstıŋ] *n* yığım, məhsul yığımı

**harvestman** ['ha:vıstmæn] *n* (*pl* **-men** [-men]) mövsümi fəhlə *(məhsul yığımı dövründə)*

**harvest-moon** ['ha:vıst'mu:n] *n* payız gecə-gündüzünün bərabərliyindən əvvəlki bədr / mahtab *(14 gecəlik ay)*

**harvest-work** ['ha:vıst'wə:k] *n* məhsul yığımı, məhsul yığımı ilə əlaqəli işlər

**has** [hæz] *(tam forması)*; [həz, əz, z, s] *(zəif formaları)*; **to have** *felinin indiki zaman forması* (III *şəxs tək*)

**has-been** ['hæz bi:n] *n* 1. *d.d.* köhnə kişi, dünyagörmüş adam; 2. öz təravətini itirmiş / saralmış / solmuş hər hansı bir şey;
◊ *It is better to be a has-been than a never-was amer. at. söz.* ≅ *Bir günün ağalığı da böyük şeydir*

**hash**[1] [hæʃ] *n* 1. xırda doğranmış bişmiş ətdən və tərəvəzdən hazırlanan xörək; **a ~ of rabbits** xırda doğranmış dovşan əti və tərəvəzdən hazırlanan xörək; 2. köhnə / çeynənmiş bir fikri/düşüncəni yeni fikir/ düşüncə kimi qələmə vermə; **a well-done ~ of his own words** öz sözlərini ustalıqla/uğurla dəyişdirmə; 3. qarışıq, həftbecər, dolaşıqlıq; *The play is a mere hash of old dramatic lumber Bu pyes sadəcə olaraq köhnə dramatik üsulların həftbecəridir;* 4. *rad.* radioqəbuledicinin səs-küyü;
◊ **to settle *smb.'s* ~** bir kəsi susmağa məcbur etmək, bir kəsin dərsini/cəzasını vermək

**hash**[2] [hæʃ] *v* 1. əti xırda-xırda doğramaq; 2. bir şeyi dolaşdırmaq/qarışıq salmaq; 3. korlamaq

**hasheesh** [hæ'ʃi:ʃ] *n* = **hashish**

**hasher** ['hæʃə$^r$] *n* ətçəkən; ət maşını

**hashish** ['hæʃıʃ] *n* həşiş *(narkotik maddə)*

**haslet** ['heızlıt] *n* 1. iç, içalat *(donuzun və s.)*; 2. cız-bız, içalat qovurması

**hasn't** [hæznt] = **has not**

**hasp**[1] [ha:sp, hæsp] *n* 1. cəftə, rəzə, siyirmə; 2. düymə, ilgək, çarpaz, bənd; 3. *toxuc.* kələf, yumaq

**hasp**[2] [ha:sp, hæsp] *v* 1. cəftələmək, siyirmə ilə bağlamaq; 2. düymələmək; 3. *arx.* bir kəsi qıfıl altında / bağlı saxlamaq

**hassock** ['hæsək] *n* 1. nazbalış; 2. dizaltı, döşəkcə *(ibadət zamanı istifadə olunan, diz çökmək üçün)*; 3. bir çəngə ot, ot koması; 4. *geol.* yumşaq qumdaşı, tuf, tuf daşı

**hastate** ['hæsteıt] *adj bot.* nizəşəkilli *(yarpaq haq.)*

**haste** [heıst] *n* 1. tələsiklik, lüzumsuz tələsmə, tələskənlik, qaç-qov; *Why all this haste? Bu qaçaqaç nəyə lazımdır?*; **in ~** tez-tələsik, ayaqüstü, əlüstü, atüstü; **to be in ~** tələsmək; *He went off in great haste O çox tələsik çıxıb getdi*; **to do *smth.* in ~** bir şeyi tez-tələsik/atüstü etmək; **to run off in ~** tələsik daban almaq / əkilmək, götürülmək/dabanına tüpürmək; *Make haste! Tələs!/Tələsin!, Cəld ol!/olun!; The matter requires haste İşi gecikdirmək/yubandırmaq olmaz*; 2. diqqətsizlik, başısoyuqluq, ehtiyatsızlıq; **to act in ~** ehtiyatsız / başısoyuq hərəkət etmək;
◊ **(the) more haste (the) less speed** ≅ *Asta gedən yorulmaz; To make more haste than good speed, Fool's haste is no speed, Haste makes waste at. söz.* ≅ *Tələsən təndirə düşər*

**hasteful** ['heıstful] *adj* 1. tələsik; 2. başdansovdu, düşünülməmiş

**hasteless** ['heıstlıs] *adj* sakit, rahat, arxayın

**hasten** ['heısn] *v* 1. tələsmək; **to ~ home/to *one's* office** evə/iş yerinə tələsmək; **to ~ into the house** tez evə girmək; **to ~ to tell *smb.* good news** şad xəbəri bir kəsə söyləməyə tələsmək; 2. tələsdirmək, tezləşdirmək; *The mother hastened the children to school Ana uşaqları məktəbə tələsdirdi*; 3. yeyinlətmək, sürətləndirmək; **to ~ *one's* steps** addımlarını yeyinlətmək/sürətləndirmək; *Artificial heating hastens the growth of plants Süni qızdırma/istilik bitkilərin böyüməsini sürətləndirir*

**hastily** ['heıstılı] *adv* 1. tələsik, tələm-tələsik, tez, cəld, tələsə-tələsə, tez-tez, əlüstü, ayaqüstü; **to dress ~** tez/əlüstü/tələsik geyinmək; 2. fikirləşmədən, düşünmədən, çox tələsik, başısoyuqluqla; **to judge ~ of *smb./smth.*** fikirləşmədən bir kəs / şey haqqında mühakimə yürütmək; 3. hövsələsiz halda, hirsli-hirsli, acıqlı, özündən çıxaraq, qeyzlə, acıqlı-acıqlı

**hastiness** ['heıstınıs] *n* 1. tələsiklik, tələsmə; 2. lazımınca düşünülməmə, başısoyuqluq; 3. hövsələsizlik, hirslilik, tündməcazlıq

**hastings** ['heıstıŋz] *n pl* faraş tərəvəz; tezdəyən meyvələr

**hasty** ['heıstı] *adj* 1. tələsik, əlüstü, tez, təcili, cəld; **~ departure** təcili yola düşmə; **~ preparations for flight** uçuşa təcili hazırlıqlar; 2. iti, atüstü; **~ glance** iti baxış; **~ sketch** atüstü çəkilmiş eskiz; *He is a hasty reader O, əlinə düşəni atüstü oxuyur;* 3. düşünülməmiş, başdansovdu; **~ decision** düşünülməmiş/başdansovdu qərar; 4. hövsələsiz, hirsli, tündməcaz, sərt; **~ temper/disposition** tünd xasiyyət; *He regretted his*

*hasty words O, sərt sözlər işlətdiyinə görə təəssüfləndi; I have been too hasty Mən həddindən çox hirslənmişəm;* 5. sürətli, tez, tezyetişən; ~ **growth** sürətlə boyatma/böyümə; ~ **fruits** tezyetişən meyvələr

**hat¹** [hæt] *n* 1. şlyapa, şapka; **a high/tall/top/ silk /chimney-pot/stove-pot** ~ silindr *(təpəsi hündür bərk şlyapa)*; **a felt** ~ fetr şlyapa *(çox zərif keçədən hazırlanan şlyapa)*; **a straw** ~ həsir şlyapa; **a** ~ **for women/ men** qadın / kişi şlyapası; **a red** ~ kardinal papağı; *məc.* kardinal rütbəsi; **to receive the cardinal's (the red)** ~ kardinal rütbəsi almaq; **to throw up/to toss** ***one's*** ~ papağını göyə atmaq *(sevinc əlaməti olaraq)*; **to lift /to raise / to touch** ***one's*** ~ **to** ***smb.*** bir kəsi salamlamaq *(hörmət əlaməti olaraq şlyapasını bir az qaldıraraq); Hats off! Şlyapanı/Şlyapanızı çıxar!/çıxarın; Off with your hat! Şapkanı/Şapkanızı çıxart!/ çıxardın!*; 2. *d.d.* göbələyin başı;

◊ **bad** ~ əclaf, yaramaz; **to take off** ***one's*** ~ **to** ***smb.*** bir kəsin qarşısında diz çökmək, bir kəsə baş əymək; ~ **in hand** yaltaqlıqla, yaltaq-yaltaq, yaltaqcasına, quyruq bulaya-bulaya; **to send / to pass round the** ~, **to go round with the** ~ ianə toplamaq; *His hat covers his family O tamamilə yalqız / kimsəsiz bir adamdır*; **to talk through** ***one's*** ~ 1) cəfəngiyyat danışmaq; 2) lovğalanmaq, özünü öymək; *My hat! Ola bilməz! Yox a! İşə bir bax a!..*

**hat²** [hæt] *v* 1. şlyapa/şapka/papaq qoymaq/ geymək; *She came in hatted and gloved O, şlyapada və əlcəkdə içəri daxil oldu*; 2. kardinallıq / kardinal rütbəsi vermək

**hatband** [ˈhætbænd] *n* 1. şlyapanın üstündəki lent; 2. şlyapanın üstündəki krep/bafta

**hat-block** [ˈhætblɔk] *n* papaq/şlyapa qəlibi

**hat-box** [ˈhætbɔks] *n* şlyapa qutusu

**hatch¹** [hætʃ] *n* I 1. lyuk, bir yerə girmək üçün dəlik/baca *(qapıda, döşəmədə, gəminin göyərtəsində və s.)*; 2. lyukun/bacanın qapağı; 3. döşəmə/anbar qapısı *(gəmidə)*; 4. hərəkət edən arakəsmə;

◊ **under** ~**es** *dən.* 1) göyərtənin altında; 2) həbsdə; 3) müsibətdə, dar gündə; 4) ölmüş, dəfn olunmuş

**hatch** [hætʃ] *n* II 1. cücə çıxartma; 2. anasından ayrılmamış balalar *(quş haq.)*

**hatch** [hætʃ] *n* III 1. ştrix, cizgi; 2. ştrixləmə; ştrixlənmə

**hatch²** [hætʃ] *v* I 1. kürt/qırt yatıb bala çıxarmaq; kürt yatmaq, qırt düşmək; 2. yumurtadan çıxmaq; *Three chicks hatched today Bu gün yumurtadan üç cücə çıxdı*; 3. süni yolla cücə çıxarmaq; 4. *zool.* doğulmaq, tökülmək *(sürfə haq.)*; 5. qəsdində olmaq, gizlicə hazırlamaq; **to** ~ **a plot** sui-qəsd hazırlamaq; 6. çoxdan fikrində tutmaq *(bir şeyi)*, fikri ilə yaşamaq *(bir şeyin)*; **to** ~ **a design** fikrində plan tutmaq; **to** ~ **a hope** ümidlə yaşamaq, ümid bəsləmək

**hatch** [hætʃ] *v* II 1. ştrixləmək, oymaq, həkk etmək; 2. kərtmək, kərtik açmaq, nişan vurmaq, çərtmək; dişəmək

**hatcher** [ˈhætʃəʳ] *n* 1. *k.t.* inkubator; 2. sui-qəsdçi, intriqan, intriqaçı, fitnə-fəsad törədən şəxs, iblis

**hatchery** [ˈhætʃərı] *n* inkubator stansiyası

**hatchet** [ˈhætʃıt] *n* 1. balta, çapacaq; 2. iri bıçaq, ət/mətbəx bıçağı;

◊ **to bury the** ~ silahı yerə qoymaq, sülhə gəlmək, dostluq münasibətləri yaratmaq; **to dig / to take up the** ~ müharibəyə başlamaq, müharibə elan etmək; **to throw the** ~ həddi keçmək, şitini çıxartmaq, ağ eləmək

**hatching-house** [ˈhætʃıŋhaus] *n k.t.* inkubator stansiyası

**hatchment** [ˈhætʃmənt] *n* üzərində gerb şəkli həkk olunmuş xatirə lövhəsi *(mərhumun yaşamış olduğu binada)*

**hatch-way** [ˈhætʃweı] *n* lyuk, baca

**hate¹** [heıt] *n* 1. nifrət, kin, ikrah; *He was filled with hate for his opponent Onun içi rəqibinə qarşı nifrətlə dolu idi*; 2. nifrət obyekti / hədəfi

**hate²** [heıt] *v* 1. nifrət etmək, zəhləsi getmək, xoşu gəlməmək; **to** ~ **hypocrisy** ikiüzlülüyə /riyakarlığa nifrət etmək; *My cat hates dogs Mənim pişiyimin itdən xoşu gəlmir; She hates anyone listening while she's telephoning O, telefon edərkən kiminsə ona qulaq asmasına nifrət edir*; 2. *d.d.* təəssüflənmək, heç istəməmək; *I hate to hurt his feelings Mən heç istəməzdim onun qəlbinə toxunum; I hate troubling you Mən heç istəməzdim, səni / sizi narahat edim*

**hateful** [ˈheıtful] *adj* mənfur, nifrət/ikrah hissi oyadan, çox pis, iyrənc; ~ **lie** iyrənc yalan; ~ **crime** mənfur/ikrah hissi doğuran cinayət; ~ **glances** nifrət dolu baxışlar; *The sight of food was hateful to the seasick girl Yeməklərin adi görünüşü gəmi tutmasından/dəniz xəstəliyindən əziyyət çəkən qızda ikrah hissi doğururdu*

**hatefully** [ˈheıtfulı] *adv* çox pis, nifrətlə, mənfur, murdar, iyrənc

**hatred** [ˈheıtrıd] *n* nifrət, ikrah; *He looked at me with hatred O mənə nifrətlə baxdı*; **to have a** ~ **for** ***smb./smth.*** bir kəsə/şeyə nifrət bəsləmək, bir kəsdən/şeydən zəhləsi getmək; **to stir up** ~ nifrət/ikrah oyatmaq

**hat-stand** [ˈhætstænd] *n* ayaqlı asılqan

**hatter** [ˈhætəʳ] *n* 1. şlyapa ustası, papaqçı; 2. şlyapa/papaq satan; 3. şlyapa fabriki; 4. *d.d.* təktənha işləyən *(qızılaxtaran haq.)*;

◊ **as mad as a** ~ qəzəblənmiş, qeyzlənmiş, qızmış, ağlını itirmiş

**hauberk** [ˈhɔ:bə:k] *n* dəmir geyim, zireh *(orta əsr döyüşçüsü libası)*

**haughtiness** [ˈhɔ:tınıs] *n* lovğalıq, dikbaşlıq, təkəbbür



**haughty** [ˈhɔ:tı] *adj* lovğa, dikbaş, təkəbbürlü, özünüöyən, təşəxxüslü; ~ **smile** təkəbbürlü gülüş; ~ **speech** təşəxxüslü/lovğa nitq; **to seem** ~ **in** ***one's*** **appearance** görünüşdən lovğa adam təsiri bağışlamaq; *The nobles used to treat the common people with haughty contempt Zadəganlar qara camaatla təkəbbürlə və saymazyana rəftar edərdilər*

**haul¹** [hɔ:l] *n* 1. çəkmə, dartma; yedəkləmə, yedəyə alma; 2. balıq torunu yığma; **at one** ~ bir dəfə balıq torunu yığanda; **a hundred fish at a** ~ bir tor atımına yüz balıq; 3. balıq ovu; **a good / rich** ~ **of sardines** yaxşı/bol sardina/siyənək balığı ovu; 4. *məc.* qənimət, trofey; **to make a good / fine** ~ yaxşıca varlanmaq, çoxlu qənimət ələ keçirməklə varlanmaq; *The thief made a good haul Oğru yaxşı qənimət əldə etdi/çox qiymətli şeylər apardı; He has such a fine haul of prizes O gör nə qədər priz alıb*; 5. daşıma, daşınma, gətirmə *(miniklə)*; çatdırma, aparma; 6. səfər, reys, yolda/ səfərdə olma; **a long** ~ uzaq reys / səfər; **a short** ~ yaxın reys / səfər; 7. yük; **a** ~ **of fruit** meyvə yükü; **heavy** ~ ağır yük

**haul²** [hɔ:l] *v* 1. çəkmək, dartmaq, çəkib/ dartıb çıxarmaq, çəkib sürümək; **to** ~ **timber / logs** taxta-şalbanı daşımaq *(ağac tədarük edilən yerdən); The elephants were hauling timber to the sawmill Fillər şalbanları taxta-şalban zavoduna daşımaqda idilər*; **to** ~ **upon/at a rope** burazı /kanatı dartmaq; *They hauled the boat up the beach Onlar qayığı dartıb sahilə çıxardılar*; 2. yedəkləmək, yedəyə almaq; 3. daşımaq, çatdırmaq, gətirmək; 4. balıq torunu dartıb çıxarmaq; 5. yön almaq, istiqamətini dəyişmək; *The ship hauled southward Gəmi cənuba doğru yön aldı; The wind hauled to the east Şərq küləyi əsməyə başladı, Külək şərq istiqamətində əsdi*; **to** ~ **down** 1) endirmək, düşürmək; 2) yavaş-yavaş buraxmaq *(burazı, ipi)*; **to** ~ **in** çəkmək, çəkib gətirmək, sormaq; **to** ~ **off** 1) uzaqlaşmaq, 2) geri çəkilmək; **to** ~ **up** 1) qaldırmaq; 2) dayanmaq; 3) danlamaq, ağzından gələni demək; *He hauled them up sharply for their neglect O diqqətsizliyə/səhlənkarlığa görə onlara ağzından gələni dedi*;

◊ **to** ~ **down** ***one's*** **flag/colours** təslim olmaq; **to** ~ ***smb.*** **over the coals** bir kəsə həddini bildirmək, bir kəsə qulaqburması vermək

**haulage** [ˈhɔ:lıdʒ] *n* 1. çəkmə, dartma; yedəyə alma; 2. daşıma, aparma *(miniklə)*; 3. daşınma xərci; 4. filizin/kömürün şaxtada daşınması

**haulaway** [ˈhɔ:lə.weı] *n* hazır avtomobillərin daşınması üçün xüsusi yük maşını

**hauler** [ˈhɔ:ləʳ] *n* 1. = **haulier**; 2. *tex.* quyu çarxı, dolamaçarx

**haulier** [ˈhɔ:ljəʳ] *n* 1. kömürdaşıyan/filizdaşıyan fəhlə *(yeraltı mədənlərdə vaqonet və ya taçka ilə işləyən fəhlə)*; 2. *maşınlarla yük daşımaqla məşğul olan şəxs və ya firma*

**haulm** [hɔ:m] *n* 1. gövdə, saplaq *(bitkilərdə)*; 2. kökümeyvəli bitkilərin gövdə və yarpaqları; 3. saman, küləş; quru yarpaq *(əsasən ev heyvanlarının altına səpmək üçün)*

**haunch** [hɔ:ntʃ] *n* 1. omba, bud; bud əti; **to squat / to sit on** ***one's*** ~**es** çömələrək oturmaq, sallağı oturmaq; *The dog was sitting on its haunches İt götü üstə oturmuşdu*; 2. dal ayaq; **to throw a horse on its** ~**es** atı şahə qaldırmaq; 3. maral/qoyun cəmdəyinin arxa/dal hissəsi

**haunch-bone** [ˈhɔ:ntʃboun] *n anat.* qılça sümüyü

**haunt¹** [hɔ:nt] *n* 1. sevimli yer, tez-tez gedilən yer, görüş yeri; ruhların, kabusların tez-tez, təkrar-təkrar baş çəkdiyi/zühur etdiyi yer; **his favourite** ~ onun çox sevdiyi yer; *They revisited the haunts of their schooldays Onlar məktəbdə oxuduqları günlərdə ən çox sevdikləri görüş yerlərinə təkrar-təkrar baş çəkdilər*; 2. sığınacaq, daldalanacaq, yurd; 3. yuva, qumarxana, tiryəkxana; 4. heyvanların / quşların yemlənmə və yataq yeri; 5. *d.d.* vərdiş, adət, qayda

**haunt²** [hɔ:nt] *v* 1. tez-tez baş çəkmək/yoxlamaq /dəymək/yoluxmaq *(hər hansı bir yerə)*; tez-tez olmaq; **to** ~ ***smb.'s*** **house** bir kəsin evində tez-tez olmaq, bir kəsə tez-tez baş çəkmək; 2. görünmək, zahir / peyda olmaq, yaşamaq, məskən salmaq *(kabus, xəyalat, kölgə, ruh, qarabasma haq.); The old castle is said to be haunted Deyirlər ki, köhnə qəsrdə ruhlar məskən salıblar; Deyirlər ki, köhnə qəsrdə tez-tez kabuslar dolaşır/peyda olurlar; Phantoms seem to haunt those gloomy streets O zülmət küçələr sanki kabuslarla doludur*; **to** ~ **about a place** hər hansı bir yerdə kabus kimi dolaşmaq; 3. kölgə kimi izləmək, dalınca getmək; 4. təqib etmək, təşvişə salmaq, rahatsız etmək *(xəyalən); Remorse haunts him continually Vicdan əzabı ona rahatlıq vermir/onu izləyir*

**haunter** [ˈhɔ:ntəʳ] *n* 1. bir yerə həmişə/ daim gələn adam; 2. kabus, kölgə, ruh; 3. əl çəkməyən / beyinə girmiş / beyindən çıxmayan fikir; bir kəsi daima izləyən fikir / xəyal / düşüncə

**hausen** [ˈhɔ:zn, ˈhauzən] *n zool.* ağbalıq

**hautboy** [ˈ(h)oubɔı] *n* 1. qoboy *(musiqi aləti)*; 2.müşk iyi verən çiyələk və ya bağ çiyələyi

**hautboyist** [ˈhoubɔııst] *n* qoboyçalan

**hauteur** [ouˈtə:ʳ] *n fr.* lovğalıq, dikbaşlıq, kibr, təkəbbür

**Havana** [həˈvænə] *n* 1. Havana siqarı, Kuba tütünündən hazırlanmış siqar; 2. Kuba tütünü

**have¹** [hæv] *n pl* **the** ~**s and the have-nots** varlılar və kasıblar *(xalq, ölkə haq.)*

**have²** [hæv] *(tam forması)*; [həv, əv, v] *(zəif formaları)* *v (pt, pp* **had**; **has** III *şəxs tək. indiki zaman forması)*; I *əsas fel kimi*: 1. malik/var olmaq; *He has (got) a family Onun ailəsi var; I have many books Mənim çoxlu kitabım var; I have no money Mənim pulum yoxdur*; **to** ~

**shares in a company** hər hansı bir şirkətin səhmlərinin şəriki olmaq; *Has the house a garden? Evin bağı varmı?; The door has no key to it Bu qapıya düşən açar yoxdur; Have you time to come with me? Mənimlə getməyə vaxtın / vaxtınız varmı?; Do you have time for reading? Sənin / Sizin oxumağa vaxtın / vaxtınız varmı?; She has blue eyes Onun mavi gözləri var; He has (got) an ear for music Onun yaxşı musiqi duyumu var; He has no sense of humour Onun yumor hissi yoxdur; Have you any idea where he lives Onun harada yaşadığı haqda təsəvvürün-təsəvvürünüz varmı?; The book has 350 pages Bu kitabın 350 səhifəsi var; May has 31 days May ayında 31 gün var; This house has three stories Bu evin üç mərtəbəsi var; You have a fireplace on your right Sənin / Sizin sağ tərəfində / tərəfinizdə kamin / buxarı var;* **2.** almaq, tutmaq, eşitmək, əldə etmək; *He had a letter O, məktub aldı; They had no news of him Onlar onun haqqında heç nə eşitməyiblər, Onların ondan heç bir xəbəri yoxdur; Let me have his order as soon as possible Onun sifarişini mümkün qədər tez mənə göndər/göndərin; The girl wants to have his name Qız onun adını bilmək istəyir; They had it from his own mouth Onlar bunu onun öz ağzından eşidiblər;* **to ~ *one's* wish** istədiyini almaq / əldə etmək; *It is to be had at the chemist's Bunu aptekdən əldə etmək olar; You may have it for five pounds Sən / Siz bunu beş funta ala bilərsən / bilərsiniz;* **3.** baş vermək, vaqe olmaq, əmələ gəlmək; *We had an earthquake last month Keçən ay bizdə zəlzələ oldu / baş verdi; We had much rain this year Bu il bizdə çox yağış oldu;* **4.** bilmək, bacarmaq, əlindən gəlmək; *He has small Latin and less Greek O, latın dilini pis, yunan dilini isə ondan da pis bilir;* **5.** *d.d.* başa düşmək, anlamaq; *Now I have your idea İndi sənin / sizin fikrini / fikrinizi başa düşürəm, İndi fikrin / fikriniz mənə çatır; You have me? Məni başa düşdün? / düşdünüz?, Məni anladın? / anladınız?;* **6.** qalib / üstün gəlmək, məğlub etmək; *He had you in the first round Birinci raundda o səni/sizi məğlub etdi;* **7.** vaxt keçirmək; *He wants to have a pleasant evening O, axşamı xoş keçirmək istəyir; Have a good time Vaxtını/Vaxtınızı xoş keçirməyi arzu edirəm!;* **8.** qida qəbul etmək, yemək, içmək; *I have dinner at three Mən saat üçdə nahar edirəm; Do you have tea or coffee for breakfast? Sən / Siz səhər yeməyi zamanı çay içirsən / içirsiniz ya qəhvə?; What will you have? Nə yeyəcəksən?/içəcəksən?; What can you let me have? Yeməyə nəyin/nəyiniz var? (restoranda, kafedə və s. işlənir); I'll have ice-cream and coffee Mənə dondurma və kofe ver /verin; Let me have some more meat Mənə bir az da ət ver/verin;* **9.** başına gəlmək, çəkmək, görmək, dözmək, qatlaşmaq *(hadisəyə, əhvalata və s.); They had quite an adventure Onların başına əsl macəra gəldi; She has a lot of trouble Onun başı bəlalar çəkir, Onun başı qovğadadır; He didn't have any trouble in finding the book O, kitabı tapmaqda heç bir əziyyət çəkmədi;* **10.** hiss etmək, ağrımaq, xəstəlik keçirmək; *She has a headache / toothache / a sore throat Onun başı/dişi / boğazı ağrıyır; He has measles O, qızılca çıxarıb/tutub; He had a bad cold in the head O, ağır zökəm keçirdi;* **11.** göstərmək *(qayğı, rəhm, mərhəmət və s.);* **to ~ pity for *smb.*** bir kəsə yazığı /rəhmi gəlmək; *He has patience with children O, uşaqlara qarşı səbr göstərir, O, uşaqlarla səbrlə davranır; Have no doubt Şübhə etməyə bilərsən / bilərsiniz; Have no fear! Qorxma!/Qorxmayın!; Please have the goodness /kindness to ring him up Lütfən ona zəng et / edin; Has she really the cheeks to ask for more money? Doğrudanmı onun yenə pul istəməyə üzü gəlir?* **12.** nəticələnmək; təsir etmək/göstərmək; *This policy had the desired effect Bu siyasət arzu olunan nəticəni verdi;* **13.** doğmaq, balalamaq; dünyaya övlad gətirmək; *She is going to have a baby Onun uşağı olacaq; The dog had four puppies İt dörd küçük balaladı, İt dörd bala doğdu;* **14.** arvad almaq; ərə getmək; *If she will have him... Əgər o ona ərə getsə...; And now the man won't have her İndi də kişi onunla evlənmək istəmir;* **15.** bir kəsi qonaq kimi qəbul etmək, bir kəsi dəvət etmək/çağırmaq *(evə);* **to ~ *smb.* in to dinner** bir kəsi evinə nahara dəvət etmək; *I had the doctor in Mən həkimi evə çağırdım/dəvət etdim; We would rather stay with you, if you will have us Əgər bizi qəbul etməyə razı olsaydınız, biz sizdə qalmaq istərdik; He is having his sisters over the Sunday Şənbə günündən bazarertəsinə qədər bacıları onun qonağı olacaqlar;* **16.** *Felisim birləşmələrində ismin mənasına uyğun məna ifadə edir və ayrı-ayrı (tək-tək) icra olunan iş və hərəkəti və yaxud qısa müddətli/sürəksiz fəaliyyəti bildirir:* **to ~ a swim /a walk/a wash/a dance/a smoke** bir az üzmək/ gəzmək/yuyunmaq/rəqs etmək/ papiros çəkmək; **to ~ a look** nəzər salmaq/yetirmək; **to ~ *smb.* (to) do/doing *smth.*** bir kəsi bir şeyi etməyə məcbur etmək; *I will have him come Mən onu gəlməyə məcbur edəcəyəm, Mən elə edəcəyəm ki, o gəlsin; We ought to have the doctor examine her Biz gərək onu həkimə göstərəydik; She had us all guessing what her next move would be Biz hamımız çalışırdıq ki, onun sonra necə hərəkət edəcəyini anlayaq; I would have you to know Mən istərdim ki, sən / siz biləsən / biləsiniz...; Will you have me to help you? Mənim sənə / sizə kömək etməyimi istəyirsənmi?/istəyirsinizmi?; Let's have her down Qoy o bizim yanımıza aşağı düşsün;* **to ~ *smth.* done 1)** *Hər hansı bir şəxsin təşəbbüsü və ya arzusu ilə icra olunan hərəkətləri bildirir:*



*He had his hair cut O, saçını/başını qırxdırdı; We had our photos taken Biz şəklimizi çəkdirdik; He had his tooth taken out O, dişini çəkdirdi; The town-council has had ten houses built Şəhər icra hakimiyyəti on bina tikdirib;* **2)** *Hər hansı bir kəsin arzu və istəyindən asılı olmayan, lakin ona yönəlmiş hərəkətləri bildirir: I had my money stolen Pulumu oğurladılar; He had his leg broken O, qıçını sındırdı; We had a note handed to us Bizə məktub verdilər; I never had my word doubted Heç vaxt mənim sözümə şübhə etməyiblər; Three houses had their windows shattered Üç evin pəncərələri sınıb dağıldı;* **to ~ to do with *smb./smth.*** bir kəsə/şeyə dəxli olmaq, aid olmaq; *This has nothing to do with you Bunun sənə/sizə heç bir dəxli /aidiyyəti yoxdur; I advise you to have nothing to do with that man Mən sənə/sizə məsləhət görürəm ki, o adamla heç bir işin/işiniz olmasın;* **to ~ *smth.* about/ on** üstündə / yanında bir şey olmaq; *He hadn't any money about / on him Onun üstündə / yanında pulu yox idi; Have you the time on you? Saatın/Saatınız üstündədir?/üstünüzdədir?; You'd better... Yaxşı olardı ki...; You'd better ask him about it Yaxşı olardı ki, sən/siz bu haqda ondan soruşasan? /soruşasınız?; You'd better go home and rest Yaxşı olardı ki, sən/siz gedib evdə istirahət edəsən/edəsiniz; You had better say it at once Yaxşı olardı ki, sən/siz bunu dərhal deyəydin/deyəydiniz;* **to ~ rather** daha yaxşı /üstün olmaq; *I had rather do it myself Bunu mən özüm etsəydim, daha yaxşı olardı; I'd rather not go Mən getməməyi üstün tutardım;* **one won't/can't ~ smth./smth. done** yol/imkan verməmək, dözməmək; *I won't have such conduct Mən bu cür rəftara dözmərəm; I cannot have it in my house Mən evimdə buna imkan vermərəm; Let's have no nonsense! Gəl/Gəlin axmaqlıq etməyək!;* **one won't / can't ~ *smb.* do/ doing *smth.*** bir kəsə bir şeyi etməyə imkan verməmək/dözməmək; *I won't have you say/saying such things Mən sənə/sizə imkan vermərəm ki, belə sözlər danışasan / danışasınız;* **to ~ it that** demək, təsdiq etmək, dediyi kimi, *The newspapers have it that... Qəzetlər təsdiq edir ki,..; Rumour has it that... Şayiə gəzir ki...; As Shakespeare has it Şekspirin dediyi kimi...;* **to ~ it out (with *smb.*)** *(bir kəslə)* hər hansı bir məsələni aydınlaşdırmaq/ müəyyənləşdirmək; *Let's have it out Gəl /Gəlin heç nəyi gizlətmədən danışaq/aydınlaşdıraq; He decided suddenly to call upon... Miss Barlow and have the matter out with her O, birdən qərara aldı ki, xanım Barloya baş çəksin və məsələni onunla aydınlaşdırsın*

**have** [hæv] *v* II *modal fel kimi: Özündən sonra gələn məsdərlə işlənərək modallıq ifadə edir; zərurilik, lazımlılıq, labüdlük, vaciblik bildirir: He has (got) to help us O bizə kömək etməlidir; You will have to wait a moment Sən / Siz bir an gözləməli olacaqsan/olacaqsınız; The money has to be paid Pulu ödəmək lazımdır, Pul ödənilməlidir; You don't have to get so excited Sənə / Sizə belə həyəcanlanmaq lazım deyil, Belə həyəcanlanmağa ehtiyac yoxdur; You don't have to apologize Üzr istəməyə ehtiyac yoxdur; I had my work to do Mənim hələ görüləsi işim var idi*

**have** [hæv] *v* III *Köməkçi fel kimi: Bu halda* **to have** *feli bitmiş zaman formalarının düzəldilməsinə (Perfect Tense Forms) xidmət edir: I* **have seen** *this film Mən bu filmi görmüşəm; He* **has read** *this book O, bu kitabı oxuyub; How long* **have** *they* **known** *each other Onlar bir-birini nə vaxtdan tanıyırlar?; I* **had sent** *the letter by that time yesterday Mən dünən bu zaman məktubu göndərmişdim; By spring we* **shall have finished** *it Bahara qədər biz bunu qurtarmış olacağıq; You* **haven't swept** *the room Sən/Siz otağı hələ süpürməmisən/süpürməmisiniz; The thief* **has been arrested** *Oğru həbs edilib; The book* **had been published** *by that time last year Kitab keçən il bu zaman nəşr olunmuşdur və s.;*

◊ **to ~ in mind** düşünmək, fikrində tutmaq; nəzərə almaq; niyyətində olmaq; *You must always have it in mind Sən / Siz bunu hər vaxt yadda saxlamalısan / saxlamalısınız;* **to ~ *smb.* in** bir kəsi qəbul etmək *(evdə); We shall have them in tomorrow Biz sabah onları qəbul edəcəyik;* **to ~ smth. in** evdə ehtiyatı olmaq, ehtiyata malik olmaq; *Do we have enough coal in for winter? Evimizdə qış üçün kifayət qədər kömür ehtiyatımız varmı?;* **to ~ it off / away with *smb.*** bir kəslə cinsi əlaqəyə girmək/əlaqədə olmaq; **to ~ *smth.* out** bir şeyi çıxartmaq /aydınlaşdırmaq; *I had it out with him Biz onunla bu məsələni aydınlaşdırdıq; I had a tooth out Mən bir dişimi çəkdirdim;* **to ~ *one's* sleep out** yuxusunu almaq, doyunca/istədiyi qədər yatmaq; *Let her have her sleep out Qoy o, doyunca/istədiyi qədər yatsın, Qoy o, özü ayılana qədər yatsın;* **to ~ *smb.* over/round** qonağı gəlmək; *We had Sue and Steeve round for supper last night Keçən axşam Syu və Stiv şam yeməyinə bizə qonaq gəlmişdilər;* **to ~ *smb.* up** bir kəsi məsuliyyətə cəlb etmək /məhkəməyə vermək; *He was had up for exceeding the speed limit Sürət həddini aşdığı üçün o, məsuliyyətə cəlb olundu;* **to ~ the law on *smb.*** bir kəsi məhkəməyə vermək; **to ~ a go/a shy/a shot/a bash / a stab at** cəhd etmək, gücünü sınamaq; **to ~ it** qalib gəlmək; *The "ayes" have it Səsvermədə "lehinə" olanlar çoxluq təşkil etdilər; This year the Cambridge crew has it Bu il Kembric komandası qalib gəlib; Let him have it! 1) Ona həddini göstər!/göstərin!, Onun dərsini ver!/verin!; 2) Onun haqqında nə düşünürsən hamısını aç*

*tök/açın tökün; He has had it* **1)** *İndi onun axırıdır, Daha onun işi bitib;* **2)** *Onun ələyi ələnib, xəlbiri göydə fırlanır (o. həddindən çox qocalıb);* **to ~ at smb.** bir kəsin üstünə cummaq/şığımaq/atılmaq; *Let us have at him Gəlin onun üstünə cumaq, Gəlin ona hücum edək;* **to ~ it in for smb.** bir kəsə qarşı kin saxlamaq/ qərəzli olmaq; *Have it in your own way Necə istəyirsən elə də et, Necə bilirsən, elə də et; He has (got) nothing on me O mənim haqqımda pis heç nə bilmir; Have done! Əl çək!/çəkin!, Bəsdir!, Qurtardı!;* **to ~ smb. cold 1)** bir kəsin taleyilə oynamaq; **2)** bir kəsi döymək / əzişdirmək

**haveless** ['hævlıs] *adj* aciz, naçar, köməksiz, bacarıqsız

**haven¹** ['heıvn] *n dən.* **1.** liman, tərsanə; **2.** sığınacaq, daldalanacaq, pənahgah

**haven²** ['heıvn] *v* gəmini limanda saxlamaq /yerləşdirmək

**haven't** [hævnt] **have not**-*un qısa forması*

**haver** ['hævəʳ] *n* I sahib, yiyə

**haver** ['hævəʳ] *n* II boş/mənasız şey, cəfəngiyyat; laqqırtı

**haversack** ['hævəsæk] *n* çiyində daşınan azuqə çantası; arxa çantası

**having** ['hævıŋ] *n* **1.** sahib olma, malik olma; yiyəlik, sahiblik; **2.** *pl* mülk, mülkiyyət, malmülk, xüsusi mülkiyyət; **3.** davranış, manera

**havoc¹** ['hævək] *n* viran edilmə, xaraba qoyulma, məhv edilmə, dağıdılma, bərbad edilmə; *The floods caused terrible havoc Daşqınlar dəhşətli dağıntılara səbəb oldu;* **to make/to create dreadful ~** ağlasığmaz dərəcədə viran etmək, dəhşətli bir xarabalığa çevirmək; **to spread ~ among the enemy** düşmən arasında vəlvələ/çaxnaşma/panika salmaq; **to make ~ of, to play ~ with/among 1)** virana qoymaq, xarabazara çevirmək; **2)** vahimə/iğtişaş salmaq; **to cry ~** *arx.* qarətə başlamaq üçün işarə vermək; çapovulçuluğa / soyğunçuluğa icazə vermək

**havoc²** ['hævək] *v arx.* dağıtmaq, xaraba qoymaq; viran / talan etmək, var-yoxdan çıxarmaq

**haw¹** [hɔ:] *n* I **1.** *bot.* yemişan giləmeyvəsi; **2.** = **hawthorn**; **3.** çəpər, alçaq hasar/barı; **4.** çəpərə alınmış yer / həyət

**haw** [hɔ:] *n* II göz zarı/pərdəsi *(heyvanda)*

**haw²** [hɔ:] *int.* ho! *(naxırçının mal-qaranı, naxırı sürmək və ya döndərmək üçün çıxardığı səs)*

**hawbuck** ['hɔ:bʌk] *n* kobud/qaba/yontalanmamış cavan; qanmaz/tərbiyəsiz oğlan

**hawfinch** ['hɔ:fıntʃ] *n zool.* baltadimdik *(balaca oxuyan quş)*

**haw-haw** ['hɔ:'hɔ:] *int.* = **ha-ha**

**hawk¹** [hɔ:k] *n* **1.** alıcı quş, şahin, tərlan, qızılquş, qırğı; **2.** *məc.* qansoran, canavar, soyğunçu, istismarçı; **3.** *məc.* fırıldaqçı, hiyləgər, dələduz;
◊ *Hawk will not pick hawk's eyes out ≅ İt itin ayağını basmaz*

**hawk²** [hɔ:k] *v* I **1.** qızılquşla / tərlanla ova çıxmaq/ov etmək; **2.** ovu havada uça-uça ovlamaq; həşəratı/cücünü havada tutmaq *(quşlar haq.); Birds hawk insects in the air Quşlar cücüləri havada uça-uça tuturlar;* **3.** şığımaq, cummaq, üstünə atılmaq; **to ~ at smb.** bir kəsin üstünə atılmaq/hücum etmək/şığımaq

**hawk** [hɔ:k] *v* II **1.** öskürüb tüpürmək, hayxırmaq, hayxırıb tüpürmək; **2.** öskürmək, boğazını arıtlamaq, hayxırıb bəlğəm gətirmək

**hawk** [hɔ:k] *v* III **1.** səyyar/küçələrdə alver etmək; **to ~ fruit** küçələrdə meyvə satmaq; **2.** *məc.* yaymaq *(şayiə və s.);* **to ~ news/gossip about** xəbər/şayiə yaymaq; **to ~ one's praises** tərifə basmaq, tərif yağdırmaq

**hawker** ['hɔ:kəʳ] *n* I **1.** tərlanla / qızılquşla ova çıxan ovçu; **2.** şahin/qızılquş ovçusu; **3.** quşağası *(alıcı quşlara baxan adam)*

**hawker** ['hɔ:kəʳ] *n* II küçədə alver edən adam, lotokçu

**hawk-eyed** ['hɔ:kaıd] *adj* **1.** şahingözlü, itibaxışlı; **2.** sayıq, ayıq, itigözlü, itigörən

**hawk-nosed** ['hɔ:k'nouzd] *adj* donqarburun

**hawser** ['hɔ:zəʳ] *n dən.* tros, buraz; şvartov, yedək ipi *(gəmini dayandığı yerə bağlamaq üçün)*

**hawthorn** ['hɔ:θɔ:n] *n bot.* yemişan ağacı

**hay¹** [heı] *n* ot, quru ot; **to make ~** ot tədarük etmək; otu qurutmaq; **~ harvest/time** ot çalını; ot çalınan vaxt;
◊ **to make ~ of smth.** alt-üst etmək; qarışıq salmaq, dağıtmaq; *Neither hay nor grass ≅ Nə ət-dir, nə balıq;* **between ~ and grass** *amer.* gənclik çağı; *Make hay while the sun shines at. söz. Dəmiri isti-isti döyərlər*

**hay²** [heı] *v* ot biçib qurutmaq, ot tədarük etmək; **to ~ down** çox qurutmaq, qupquru eləmək *(tütünü)*

**hay-carrier** ['heı.kærıəʳ] *n* **1.** otyığan/otyükləyən maşın; **2.** yedək arabası *(ot daşımaq üçün avtomobilin / traktorun dalına qoşulan yedək)*

**hay-cold** ['heı'kould] *n tib.* ot qızdırması

**hay-cock** ['heıkɔk] *n k.t.* qotman, dərz/ot qalağı/qotmanı

**hay-drier** ['heı.draıəʳ] *n k.t.* otqurudan maşın

**hay-fever** ['heı'fi:vəʳ] *n tib.* ot qızdırması

**hay-fork** ['heıfɔ:k] *n* yaba, ot yabası

**hay-heating** ['heı.hi:tıŋ] *n k.t.* otun öz-özündən qızışması, otun yanması

**haying** ['heıŋ] *n k.t.* **1.** ot tədarükü; **2.** qotmanlama, qotman / taya vurma, tayaya vurma *(otu)*

**hayland** ['heılænd] *n k.t.* biçənək, biçənək yerləri

**hayloft** ['heılɔft] *n* samanlıq

**haymaker** ['heı.meıkəʳ] *n* **1.** ot tədarükü ilə məşğul olan fəhlə; **2.** otçevirən maşın

**haymaking** ['heı.meıkıŋ] *n* ot çalını; otun biçilməsi və qurudulması; ot tədarükü

**haymaking machine** ['heı.meıkıŋmə'ʃi:n] *n* otbiçən maşın



**haymow** ['heımou] *n* samanlığa yığılmış ot; ot tayası

**hayrick** ['heırık] *n* = **haystack**

**hayseed** ['heısi:d] *n* **1.** ot toxumu; **2.** ot/saman qırıntısı; **3.** kəndli-kütlü, kəndçi

**haystack** ['heıstæk] *n k.t.* ot tayası; taya

**hay-tedder** ['heı.tedəʳ] *n k.t.* otçevirən maşın

**hazard¹** ['hæzəd] *n* **1.** risk, təhlükə; **to take ~s** riskə getmək; **to run/to stand the ~** risk etmək; *Smoking is a health hazard Papiros çəkmək səhhət üçün təhlükəlidir;* **a life full of ~s** təhlükələrlə dolu həyat; **at all ~s** nəyin bahasına olursa olsun; **at the ~ of one's life** öz həyatı bahasına; **2.** şans, ehtimal, güman; **to select at ~** bəxtəbəxt seçmək; **3.** aşıq atma, cay *(aşıqla oynanılan qədim qumar oyunu);* **4.** süni və təbii maneəli meydança *(qolf meydançası);* **5.** luza, bilyard toru

**hazard²** ['hæzəd] *v* **1.** risk etmək, təhlükə altına qoymaq; *Rock-climbers sometimes hazard their lives Alpinistlər bəzən öz həyatlarını təhlükə altına qoyurlar;* **to ~ all consequences** hər vasitəyə əl atmaq *(nəticəsini, fəsadını nəzərə almadan);* **2.** cürətlənmək, cürət/cəsarət etmək; **to ~ a question** cürət edib sual vermək; **3.** şarı vurub luzaya salmaq *(bilyard oyununda)*

**hazardable** ['hæzədəbl] *adj* riskli, təhlükəli; cürətli, cəsarətli

**hazardous** ['hæzədəs] *adj* **1.** riskli, qorxulu; cəsarətli, cürətli; **a ~ enterprise** riskli müəssisə; riskli iş; **~ expedition** qorxulu ekspedisiya; **2.** *geol.* **~ rock** zəif/boş çuxur

**haze¹** [heız] *n* **1.** zəif duman, çən; *A thin haze veiled the hills Dağları zəif duman bürüdü/çulğadı;* **2.** dumanlı baş / düşüncə

**haze²** [heız] *v* I **1.** bürümək, düşmək, çulğamaq *(duman haq.);* **2.** bürünmək, örtülmək, çulğalamaq

**haze** [heız] *v* II **1.** *dən.* taqətdən/əldən salmaq, işlə üzmək; ən ağır iş həvalə etməklə cəzalandırmaq; **2.** lağa/araya qoymaq, ələ salmaq *(təzə, təcrübəsiz dənizçiləri)*

**hazel¹** ['heızl] *n bot.* **1.** fındıq/qoz ağacı *(meşədə);* **2.** fıstıq/qoz ağacından taxta-şalban; **3.** = **hazel-nut**; **4.** açıq-qəhvəyi rəng

**hazel²** ['heızl] *adj* **1.** açıq-qəhvəyi, qonur, tünd darçını, şabalıdı; **~ eyes** qonur gözlər; **2.** fıstıq/qoz ağacından *(qayrılmış)*

**hazel-grouse** ['heızl'graus] *n* = **hazel-hen**

**hazel-hen** ['heızlhen] *n zool.* qarabağır *(quş)*

**hazel-nut** ['heızlnʌt] *n* fındıq, meşə qozu

**hazel-wood** ['heızlwud] *n* fındıq ağacı; fındıqlıq, qozluq

**hazily** ['heızılı] *adv* dumanlı, tutqun, mübhəm bir surətdə, qarışıq

**haziness** ['heızınıs] *n* tutqunluq, donuqluq; dolaşıqlıq, anlaşılmazlıq

**hazy** ['heızı] *adj* **1.** dumanlı, çənli, dumana bürünmüş, tutqun; **~ weather** tutqun / dumanlı hava; **~ wood** dumana bürünmüş meşə; **2.** *məc.* qarışıq, qeyri-müəyyən, dumanlı, mübhəm; **~ idea** dumanlı ideya

**H-bomb** ['eıtʃbɔm] *n* hidrogen bombası

**he¹** [hi:] *(tam forma)* [i:, hı, ı] *(zəif formalar) pers. pron.* **1.** o *(insan haq. kişi cinsi); Where is your brother? He is at school Qardaşın/Qardaşınız haradadır? O, məktəbdədir; That's he Bu odur;* **2.** o; *Heyvanlar, hisslər, təbiət olayları şəxslənəndə işlənir: The dog stopped; he had heard a rustle İt dayandı; o, xışıltı eşitmişdi*

**he²** [hi:] *int.* hi-hi *(rişxənd, nifrət ifadə edir);* He-he! Hi-hi! Ha-ha!

**he-** [hi:-] **1.** *Mürəkkəb sözlərin komponenti kimi işlənərək bəzi heyvanların erkək olmasını bildirir;* **—dog** köpək; **—wolf** erkək canavar; **—goat** təkə; **—duck** erkək ördək; **2.** *zaraf.* kişi, əsl *(həqiqət çalarlı);* **—man** əsl kişi, kişi adam; *Tom is a real he-man! Tom əsl kişidir! Tom kişi adamdır!*

**head¹** [hed] *n* I **1.** baş, kəllə; *The thief cut his head off Oğru onun başını kəsdi; It cost him his head Bu ona başı bahasına başa gəldi;* **a nod of the ~** başını yelləmə *(razılıq əlaməti);* **to shake one's ~** başını bulamaq *(inkar, bəyənməmə əlaməti); Many nobles lost their heads during the French Revolution Fransız inqilabı zamanı çox zadəganlar başlarını qurban verdilər;* **2.** bir baş boyda, bir az *(uzunluq ölçüsü); Tom is taller than Harry by a head Tom Hərridən bir az/bir baş boyda hündürdür; The Queen's horse won by a head Şahzadənin atı bir baş boyda irəliyə çıxıb qələbə qazandı (cıdırda);* **3.** baş *(cəmdə dəyişmir)* say, hesablama vahidi; **a thousand ~ of cattle** min baş qaramal; **4.** dəstə, qatar, sürü *(quş haq.);* **a large ~ of bird** böyük quş dəstəsi; **5.** ağıl, zəka, düşüncə, dərrakə, fərasət, qabiliyyət, bacarıq; **a clear ~** parlaq zəka; **a cool ~** soyuq baş, dərrakəli / düşüncəli adam; **a hot ~** qızmış baş, əsəbi / hirsli adam; **a wise ~** ağıllı baş; **a wooden ~** taxtabaş, küt / korazehin / kütbeyin adam; **to have a good ~ on one's shoulders** yaxşı/ağıllı başı olmaq, başı yerində olmaq; *He has a good head for figures Onun hesabdan yaxşı başı çıxır;* **to trouble/to bother one's ~ about smth. 1)** bir şey üçün narahat olmaq; **2)** bir şey üzərində baş sındırmaq; **to take smth. into one's ~** beyninə yeritmək, başına... düşmək; *He took it into his head that I was secretly opposing him O, beyninə yeridib ki, mən gizlicə ona zidd gedirəm;* **to come into one's ~** ağlına gəlmək, beyninə düşmək; *It came into his head... Onun ağlına gəldi...;* **to keep smth. in one's ~** bir şeyi başında saxlamaq; **to use one's ~** baş işlətmək, fikirləşmək; **6.** adam, insan, şəxs; **the wiser ~s** müdrik insanlar, aqillər; **the crowned ~s of Europe** Avropanın tacdar zatları; **ten dollars a / per ~** adambaşına on dollar, adama on dollar; **7.** *d.d.* başağrısı *(sərxoşluqdan sonra); He has a head*

*Onun içkidən başı ağrıyır;* 8. *jarq.* dil, ağız; **to keep** ***one's*** **~ shut** dilini saxlamaq, ağzını yummaq, kiriməк; 9. *arx.* saç

**head** [hed] *n* II 1. yuxarı hissə, yuxarı, kəllə, baş; **the ~ of the mountain** dağın başı; **the ~ of stairs** pilləkənin başı; **at the ~ of the page** səhifənin başında; 2. çətir *(ağaclarda)*; **the ~ of the tree** ağacın çətiri *(baş hissəsi)*; 3. forma, duruş, vəziyyət və mövqeyinə görə başı xatırladan, başa oxşayan bir şey; **the ~ of a pin** sancağın başı; **the ~ of a nail** mıxın başı; **the ~ of hammer** çəkicin başı; 4. *tib.* yetişmiş yaranın / çibanın başı; **to come/to draw to a ~, to gather ~** yetişmək *(irinlik, yara, çiban haq.)*; 5. başlıq, ad, sərlövhə, fəsil, rubrika; **~s of chapters** fəsillərin adları; **under different ~s** müxtəlif rubrika ilə; 6. ön / qabaq / baş hissə, ...önündə; **the ~ of a column** sütunun/kolonun başı; **at the ~ of the chapter** fəslin başında; **at the ~ of the table** masanın başında *(fəxri yerdə)*; **at the ~ of the bed** çarpayının baş tərəfində; **to be at the ~ of the field / pace** *id.* yürüşə başçılıq etmək, yürüşün önündə olmaq; 7. əsas mənbə, çayın başı/ yuxarı axarı; **the ~ waters of the Nile** Nil çayının əsas mənbəyi və yuxarı axarları; 8. *pl* üz tərəf; *Heads and tails? "Oryol-reşka?" deyə niyyət tutub püşk atma)*; 9. köpük, üz *(pivə və s. köpüklənən mayelərin)*; **with a ~ on** köpüklü; **~ of the milk** südün xaması / üzü/köpüyü

**head** [hed] *n* III 1. başçı, rəis; böyük, rəhbər; **the ~ of the family** ailənin başçısı; **the ~ of a department** şöbə rəisi; **the ~ office** baş idarə; **the ~ of Government / State** hökumət / dövlət başçısı; **the ~ of a party** partiya rəhbəri / lideri; **the ~ of the army** silahlı qüvvələr komandiri; **the ~ of a clan** qəbilə başçısı; 2. aparıcı, rəhbər vəzifə; **at the ~ of the whole business** bütün müəssisənin/başlanmış işin başında; **~ nurse** böyük tibb bacısı; **~ waiter** restoranda baş ofisiant; **~ electrician** işıqçıların briqadiri/başçısı; **the ~ man of the tribe** qəbilə başçısı; **~ of water** 1) yığılmış suyun müəyyən hündürlük səviyyəsi *(su elektrik stansiyasında)*; 2) germetik / kip qaba sıxışdırılmış buxarın təzyiqi və ya gücü *(hər sm²-ə düşən)*; *They kept up a good head of steam Onlar buxarın təzyiqini yaxşı saxladılar (aşağı düşməyə qoymadılar)*;

◊ **a ~ of hair** gur saç; **a good ~ of hair** sıx gur saç; **raw ~ and bloody bones** 1) kəllə sümüyü və çarpazlaşdırılmış iki bud sümüyünün şəkli *(təhlükə işarəsi)*; 2) uyuq, qorxuluq; **over ~ and ears, ~ over ears in love** bir könüldən min könülə vurulmuş, eşq divanəsi olmuş, **~ over ears in debt** xirtdəyə/boğaza qədər borc içində olan; **over** ***smb.'s*** **~** bir kəsin başı üstündən, bir kəsə xəbərdarlıq etmədən; *An old head on young shoulders ≅ Ağıl yaşda deyil, başdadır;* **soft in the ~** yelbeyin, başıboş, başdan xarab; **from ~ to foot/heel** başdan ayağa, təpədən dırnağa; **to shake** ***one's*** **~ at** ***smth.*** bir şeydən şübhələnmək/şəkkə düşmək; **to hang/to have** ***one's*** **~ down** başını aşağı salmaq, xəcalət çəkmək, utanmaq, xəcalətindən başını qaldıra bilməmək; **to stand with** ***one's*** **~ down** məyus-məyus başını aşağı sallayıb durmaq; **to hold** ***one's*** **~ up, to carry** ***one's*** **~ high** başını uca tutmaq; *Heads up! Havaya nəzarəti gücləndirin! (komanda, əmr)*; **to lose** ***one's*** **~** başını itirmək; **to keep** ***one's*** **~** başını itirməmək; **to keep a cool ~** soyuqqanlılıq göstərmək, özünü itirməmək; **to lift up** ***one's*** **~** ruhlanmaq, şövqə gəlmək; **to be ~ and shoulders above others** başqalarından çox üstün olmaq; **to stake** ***one's*** **~ on, to give** ***one's*** **~ for** başı ilə cavab vermək, başını qoymaq, zamin olmaq/durmaq; **to put** ***one's*** **~ in a noose** başını bəlaya salmaq, başını kəndirə keçirmək; **to make ~** irəliləmək; **to make ~ against** 1) baş qaldırmaq, qiyam etmək; 2) uğurla müqavimət göstərmək; 3) müqavimətə baxmayaraq irəliləmək; **to have a cold in the ~** soyuqlamaq, tumov / zökəm olmaq; *He has a cold in the head Ona soyuq dəyib, O, zökəm olub*; **to stand on** ***one's*** **~** başına çıxmaq; **to talk** ***smb.'s*** **~ off** bir kəsin başını/baş-beynini aparmaq; **to work** ***one's*** **~ off** yıxılana qədər işləmək; **to beat** ***smb.'s*** **~ off** darmadağın etmək; **to eat** ***one's*** **~ off** yediyinin xərcini ödəməmək *(at haq.)*; xərci borcunu ödəməmək; **off** ***one's*** **~** başına at təpmiş, ağlını itirmiş, ağlı başında olmayan; **to be weak in the ~** zəif əqli qabiliyyətə malik olmaq; **to go off/out of** ***one's*** **~** dəli/başı xarab olmaq; **to be touched in the ~** ağlı başında olmamaq, bir vinti çatmamaq; gic/ağıldan kəm olmaq; *He is touched in the head Onun bir vinti çatmır, Onun ağlı başında deyil*; **to turn** ***smb.'s*** **~** başını gicəllənd irmək/azdırmaq, başdan çıxarmaq; **to break** ***one's*** **~ over** ***smth.*** bir şey üzərində baş sındırmaq; **to bury** ***one's*** **~ in the sand** başını kola soxmaq, straus siyasəti tərəfdarı olmaq *(təkidlə real faktları nəzərə almaqdan boyun qaçırmaq)*; **to cut / to make shorter by the ~** boynunu vurmaq; **to fling oneself at** ***smb.'s*** **~** boynuna sarılmaq; **to go about with** ***one's*** **~ in the air** iddia/təşəxxüs satmaq, özünü çəkmək, lovğalanmaq; **to take the ~** 1) baş aparmaq, dayanmaq bilməmək *(at haq.)*; 2) yolunu azmaq, pis yola düşmək, tabe olmamaq, qulaq asmamaq; **to give** ***smb.*** **his ~** sərbəstlik vermək, başlı-başına buraxmaq; **to give** ***one's*** **~ for the washing** acizanə təhqirə dözmək; **to go to the ~** 1) başına/beyninə vurmaq *(şərab haq.)*, kefləndirmək, sərxoş / məst etmək; *The whisky has gone to his head Viski onun başına vurub*; 2) başını gicəlləndirmək; *His successes have gone to his head Uğurları onun başını gicəlləndirib*; **to have** ***one's*** **~ in a**



**tar barrel** pis vəziyyətə düşmək, biabır olmaq; **~ over heels, heels over ~** 1) kəlləmayallaq, başı/təpəsi üstə *(gəlmək)*; 2) *məc.* təpədən-dırnağa/başdan-ayağa kimi; tamamilə; **to be ~ in debt** başdan-ayağa borc içində olmaq; **to be ~ in love** bir könüldən min könülə vurulmaq, eşq divanəsi olmaq; **to keep / to hold** ***one's*** **~ over water** güc-bəla ilə dolanmaq, özünü çətinliklə dolandırmaq, bir təhər dolanmaq/ keçinmək; çulunu sudan çıxartmaq; **to keep** ***one's*** **~ above ground** sağ qalmaq, ömür sürmək, güzəran keçirmək; **to knock** ***smth.*** **on the ~** bir şeyə son qoymaq; **to knock** ***smb.'s*** **~s together** mübahisə edənləri zorla barışdırmaq; **to lay / to put ~s together** məsləhətləşmək, başbir olmaq, başbaşa vermək; **to make ~ or tail of** ***smth./smb.*** bir şeyi/kəsi anlamaq, başa düşmək, duymaq, baş çıxarmaq; *It is difficult to make head or tail of the whole business Bütün bu işlərdən baş çıxarmaq çətindir*; **not to make ~ or tail** dolaşıb qalmaq, baş çıxara bilməmək, anlaya / duya bilməmək; *I could see they couldn't make head or tail of the old creature Mən başa düşürdüm ki, onlar bu ixtiyar qocanı anlaya bilmirlər*; **to hit the nail on the ~** 1) lap yerinə düşmək, sərrast/lap yerində demək, hədəfə vurmaq; 2) düzgün hərəkət etmək; *Big head and little wit ≅ Başı böyük, ağlı yox*; **to wash an ass's ~** boş/əbəs yerə əlləşmək / cəhd etmək; *Two heads are better than one at. söz. Ağıl ağıldan üstün olar; Better be the head of a dog than the tail of a lion Baş ol, lap soğan başı olsun*

**head²** [hed] *v* 1. başçılıq etmək, başında durmaq *(bir işin)*, öndə dayanmaq/getmək; **to ~ an army/procession/a parade** orduya/mərasimə/parada başçılıq etmək; *His name heads the list Onun adı siyahıda başdadır*; 2. mane olmaq, maneçilik törətmək, qabağını kəsmək; **to ~ a flock of sheep** qoyun sürüsünün qabağını kəsmək; 3. istiqamətləndirmək, yönəltmək; **to ~ a boat towards shore** qayığı sahilə tərəf yönəltmək; *He headed his flock for home O, sürünü evə apardı / sürdü; He headed him to the proper door O, lazım olan qapını ona göstərdi*; 4. istiqamətlənmək, yönəlmək, yön / istiqamət almaq, yola düşmək; **to ~ south** cənuba yön almaq; *How does the ship head Gəmi hara / hansı istiqamətə yola düşür?*; 5. sərlövhə vermək, ad/başlıq qoymaq *(məqaləyə, kitaba və s.)*; **to ~ a chapter** fəsilə ad qoymaq; 6. topu başı ilə vurmaq, başı ilə oynamaq *(futbolda)*; **to ~ the ball** başı ilə topu vurmaq *(futbol oyununda)*; 7. mənbəyini almaq/götürmək; *The Potomac heads in the Alleghanies Potomək çayı öz mənbəyini Alleqeniz dağlarından alır /götürür*; 8. ağacın/bitkilərin başını vurmaq/ kəsmək; 9. irinləmək, çirk eləmək; yetişmək *(yara, çiban, irinlik haq.)* **to ~ back** 1) yolunu kəsmək *(düşmənin)*; 2) budamaq/kəsmək *(ağacı)*; **to ~ off** mane olmaq; **to ~ off a quarrel** davanın/ mübahisənin qarşısını almaq; *Tom headed him off from making a speech Tom onun çıxış etməsinə mane oldu*; **to ~** ***smb.*** **off from the wrong way** bir kəsi yanlış yoldan çəkindirmək, bir kəsə düz yol göstərmək; bir kəsi haqq yoluna döndərmək

**headache¹** ['hedeɪk] *n* başağrısı; **to suffer from ~(s)** baş ağrısından əziyyət çəkmək; *I have a bad / a splitting headache Başım bərk ağrıyır/çatlayır*

**headache²** ['hedeɪk] *adj* başağrısı; **~ pill/ powder** başağrısı həbi/toz dərmanı

**headachy** ['hedeɪkɪ] *adj d.d.* 1. başağrısından əziyyət çəkən; 2. başağrısı verən; **~ wine** başağrısı verən şərab

**headband** ['hedbænd] *n* başa bağlanan lent

**headcloth** ['hedklɔθ] *n* baş yaylığı, örpək

**head-cold** ['hedkould] *n* tumov, zökəm

**head-dress** ['heddres] *n* 1. baş geyimi *(xüs. yaraşıqlı)*; 2. saç, saç qoyma forması, saç düzümü

**headed cabbage** ['hedɪd'kæbɪdʒ] *n bot.* baş kələm

**header** ['hedəʳ] *n id.* 1. başı üstə suya tullanma; **to take a ~ into a river** çaya tullanmaq/baş vurmaq; 2. su kollektoru; 3. başla zərbə *(futbolda)*; 4. magistral; 5. baş kanal; 6. suvarma sisteminin baş hissəsi; 7. başçı, rəhbər; 8. *arx.* cəllad, başkəsən

**head-feeler** ['hed,fi:ləʳ] *n* psixiatr

**head-gear** ['hedgɪəʳ] *n* 1. baş geyimi; 2. *id.* dəbilqə, dəmir papaq; 3. kəllə qayışları *(yüyəndə)*; 4. qazma vışkası/buruğu *(şaxtanın üstündə)*

**heading** ['hedɪŋ] *n* 1. sərlövhə, başlıq, ad, rubrika; 2. topa baş ilə zərbə endirmə *(futbolda)*; 3. istiqamət, kurs, səmt *(gəminin, təyyarənin)*; 4. qazmanın istiqaməti; baş/əsas ştrek, yeraltı yol; 5. *k.t.* sünbülləmə, sünbül bağlama; 6. başbağlama *(kələm və s.)*

**headland** ['hedlənd] *n* 1. *coğ.* burun; 2. *k.t.* qoruyucu zolaq, şumlanmış tarlanın kənarı; 3. dönmə zolağı *(k.t. alətləri üçün)*

**headless** ['hedlɪs] *adj* 1. başı kəsilmiş / vurulmuş; 2. başçısız/rəhbərsiz qalmış; 3. *məc.* başsız, ağılsız, gic

**headlight** ['hedlaɪt] *n* fara *(avtomobildə)*; qabaq projektor *(lokomotivdə)*; qabaq işıq *(təyyarədə, gəmidə)*

**headline** ['hedlaɪn] *n* 1. qəzet başlığı; 2. *pl* son xəbərlərin qısa xülasəsi *(radio, TV ilə)*;

◊ *He hit the headline Bütün qəzetlər onun haqqında yazırdı*

**headliner** ['hed,laɪnəʳ] *n amer. d.d.* məşhur aktyor, kino ulduzu

**headlong¹** ['hedlɔŋ] *adj* 1. başıüstə; **~ fall** başıüstə düşmə/yıxılma; **~ dive** başıüstə suya cumma; 2. tələsik, ehtiyatsız; **~ decision** tələsik qərar; 3. kəskin, qabağıalınmaz; **~ fury** kəskin qəzəb; 4. sıldırım, yalçın; **~ rocks** yalçın qayalar

**headlong²** ['hedlɔŋ] *adv* 1. başıüstə; **to fall ~** başıüstə düşmək; 2. dəli kimi, ağılsızcasına, azğıncasına; çox tez/iti; düşünmədən, fikirləşmədən; **to rush ~ into danger** düşünmədən özünü təhlükəyə atmaq

**headman** ['hedmæn] *n (pl* **-men** [-men]) 1. rəis, müdir; 2. qəbilə başçısı; 3. onbaşı, baş fəhlə; 4. cəllad

**Headmaster** ['hed'ma:stəʳ] *n* məktəb direktoru

**Headmistress** ['hed'mıstrıs] *n* məktəb direktoru *(qadın)*

**head-money** ['hed.mʌnı] *n* 1. *tar.* can vergisi, adam başına alınan vergi; 2. *amer.* seçki vergisi; 3. cinayətkarın tutulması və ya düşmənin başı üçün müəyyən olunmuş mükafat; 4. *tar.* azadlıq pulu *(pul verib əsiri, qulu azad etdirmə)*

**head-on¹** ['hed'ɔn] *adj* ön, qabaq, üzbəüz, baş-başa; **~ attack** *hərb.* üzbəüz hücum; **~ collision of trains** qatarların baş-başa toqquşması

**head-on²** ['hed'ɔn] *adv* 1. üzbəüz, başı ilə, qabaq hissəsilə; *The vessel struck the rocks head-on Gəmi burnu ilə qayaya toxundu*; 2. sərt, qəti, düzünə, birmənalı; **to meet an issue ~** bir məsələdə sərt mövqe tutmaq, məsələni birmənalı qoymaq

**headphone** ['hedfoun] *n (adət. cəmdə)* baş telefonu, qulaq radiosu; qulaqlıq *(telefonda, radioda)*

**head-piece** ['hedpi:s] *n* 1. dəbilqə, kaska, təskülah; 2. fərasət, zehin, dərrakə, fəhm, ağıl; 3. qulaqlıq *(radioda)*; 4. *poliqr.* başlıq şəkil *(kitabın və ya fəslin başında şəkil, bəzək, naxış)*

**headquarters** ['hed'kwɔtəz] *n (Fellərlə həm tək, həm də cəmdə işlənir)* 1. *hərb.* ştab, qərargah; **General ~** baş qərargah; 2. baş idarə/qərargah; **Permanent ~ of the United Nations** BMT-nin Daimi Baş Qərargahı; **police ~** baş polis idarəsi; 3. etibarlı, mötəbər/mənbə *(məlumat və s.)*

**head-resistance** ['hedrı'zıstəns] *n av.* havanın təyyarəyə qarşıdan göstərdiyi müqavimət

**head-sea** ['hedsı:] *n* qarşıdan gələn dalğa

**headsman** ['hedzmən] *n (pl* **-men** [-men]) cəllad

**headspring** ['hedsprıŋ] *n* bulaq, qaynaq *(həm də məc.)*

**head-stall** ['hedstɔ:l] *n* yüyənin kəllə qayışları; noxta, ovsar

**head-stone** ['hedstoun] *n* təməl / guşə daşı

**headstone** ['hedstoun] *n* 1. başdaşı, qəbirdaşı; 2. başdaşı yazısı, kitabə

**headstrong** ['hedstrɔŋ] *adj* özbaşına, öz bildiyini edən, tərs, inad, inadcıl

**headwaters** ['hed.wɔtəz] *n pl* 1. əsas suburaxıcı *(artıq suyun axması üçün bəndin divarında açılan deşik)*; 2. əsas su anbarı; 3. suyun mənbəyi; **the ~ of the Nile** Nil çayının mənbəyi

**headway** ['hedweı] *n* 1. irəliləmə, irəliləyiş; **to make ~** irəli getmək, irəliləmək; yol salmaq / çəkmək / açmaq *(meşədən, cəngəllikdən və s.)*; 2. proqres, tərəqqi, irəliləmə; 3. eyni istiqamətdə hərəkət edən iki nəqliyyat növü *(qatarlar, avtobuslar)* arasındakı fasilə və ya məsafə

**head-work** ['hedwə:k] *n* 1. zehni iş, əqli əmək; 2. *mem.* qəsr daşı üzərində kəllə / baş təsviri; 3. *tex.* kopyor *(qaldırıcı mexanizm qurmaq üçün taxta üzərində qurğu)*

**heady** ['hedı] *adj* 1. fikirsiz, tələsik, diqqətsiz; əsəbi, tez özündən çıxan, özbaşına; **~ judgement** tələsik mühakimə; 2. çox iti / sürətli; şiddətli, gur; **~ current** şiddətli / gur axın/sel; 3. tünd, qəliz; **~ ale** tünd pivə; 4. məstedici; **the ~ air of spring** yazın məstedici havası

**heal** [hi:l] *v* 1. *(həm də* **to ~ up/over)** sağaltmaq *(yaranı)*, bitişməyə / sağalmağa / yaxşı olmağa səbəb olmaq *(yaranın)*; *The ointment healed the wound Məlhəm yaranı sağaltdı*; 2. sağalmaq, bitişmək; *The wound healed slowly Yara yavaş-yavaş sağaldı; The sore soon healed up/over Çiban/Sızaq tezliklə sağaldı*; 3. şəfa vermək, sakit etmək, yüngülləşdirmək; *Time heals most troubles Zaman hər dərdi sağaldır, Zaman ən yaxşı təbibdir*

**healable** ['hi:ləbl] *adj* sağala /müalicə oluna bilən, müalicəsi mümkün olan

**heal-all** ['hi:l.ɔ:l] *n* 1. universal məlhəm *(həm də məc.)*; 2. *bot.* qarabaşlı *(ot, bitki)*

**healer** ['hi:ləʳ] *n* 1. şəfaverici; 2. müalicə dərmanı; *Time is a great healer Vaxt/Zaman ən yaxşı məlhəmdir*

**healing¹** ['hi:lıŋ] *n* 1. müalicə, sağaltma; **~ of wounds** yaranın müalicəsi; 2. sağalma, bitişmə *(yara haq.)*

**healing²** ['hi:lıŋ] *adj* müalicə, müalicəvi, şəfalı; **~ waters** müalicə suları; **~ ointments** müalicə məlhəmləri; **a ~ word** təsəlli verən/məlhəm kimi təsir edən söz

**health¹** [helθ] *n* 1. sağlamlıq, səhhət; səhiyyə; **Ministry of Health** Səhiyyə Nazirliyi; **bill of ~** sanitar şəhadətnaməsi, karantin şəhadətnaməsi; **to have / to enjoy good ~** sağlam olmaq; **to be in good ~** sağlam olmaq; **to be in poor / bad ~, to be out of ~** səhhəti pis / zəif olmaq; **to recover / to regain / to restore *one's* ~** səhhətini bərpa etmək, sağalmaq; **to look after *one's* ~** sağlamlığına/səhhətinə fikir vermək; **to preserve *one's* ~** sağlamlığını qorumaq; **to risk/to endanger/to expose /to danger *one's* ~** səhhətini təhlükə qarşısında qoymaq; **to ruin *one's* ~** səhhətini korlamaq; **to enquire after *smb.'s* ~** bir kəsin səhhəti haqqında soruşub xəbər tutmaq; **to drink *smb.'s* ~** bir kəsin sağlığına içmək; **to propose *smb.'s* ~** bir kəsin şərəfinə tost demək; *(To) Your health! Sənin/Sizin sağlığına/sağlığınıza!*; 2. *təşkilat adlarında*: **the World Health Organization** *(qısa forması: WHO)* Ümumdünya Səhiyyə Təşkilatı; **the Department of Health and Social Security** *(Böyük Britaniyada: qısa forması: DHSS)* Səhiyyə və Sosial Müdafiə Departamenti/Nazirliyi; 3. müalicə gücü; *There's health in the sea-breezes and sunshine Dəniz küləyi və günəşin müalicə gücü var*; 4. rifah, xoş güzəran, firavanlıq, çiçəklənmə, həyat qabiliyyəti; **a menace to the economic ~ of the country** ölkənin iqtisadi çiçəklənməsinə təhlükə; **~ education** sanitariya maarifi/ təhsili;

◊ *A good health is above wealth, Wealth is nothing without health* ≅ *at. söz. Sağlamlıq var-dövlətdən üstündür; Neylərəm o qızıl təşti ki, içində qan qusacağam*

**health²** [helθ] *adj* sağlamlıq; **~ center** sağlamlıq mərkəzi; **infant ~ center** uşaq sağlamlıq mərkəzi, uşaq məsləhətxanası/ dispanseri; **~ insurance** sağlamlıq sığortası; **~ care** sağlamlıq qayğısı

**healthful** ['helθful] *adj* 1. sağlam; **~ country** sağlam diyar/ölkə; **~ mind** sağlam ruh; 2. müalicəvi, müalicə əhəmiyyətli; **~ water / air** müalicə əhəmiyyətli su / hava

**health-officer** ['helθ.ɔfısəʳ] *n* sanitar həkimi

**health-resort** ['helθrı.zɔ:t] *n* kurort

**healthy** ['helθı] *adj* 1. sağlam; **to be of ~ constitution** sağlam/möhkəm orqanizmə malik olmaq; **to be ~ and strong** sağlam və güclü olmaq; *The children look very healthy Uşaqlar çox sağlam görünürlər; The children are very healthy Uşaqlar çox sağlamdırlar*; 2. həyat qabiliyyəti olan, çiçəklənən, sağlam; **~ economy** sağlam / çiçəklənən iqtisadiyyat; 3. ağıllı, məntiqə uyğun, ağlabatan, sağlam; **~ views** məntiqi baxışlar, ağlabatan fikirlər; **~ judgement** sağlam düşüncə/mühakimə; 4. xeyirli, faydalı, qərəzsiz, cana xeyirli, təmiz; **~ air** təmiz hava; **a ~ way of living** sağlam həyat tərzi; **~ criticism** faydalı/ qərəzsiz tənqid; **~ food** faydalı/cana xeyirli qida

**heap¹** [hi:p] *n* 1. yığın, topa, qucaq, qalaq; **a ~ of stone** bir qalaq daş; **a ~ of books** bir yığın/qucaq kitab; 2. *pl d.d.* çoxlu, hədsiz, hədsiz-hesabsız; **to make a ~ of mistakes** hədsiz səhv etmək; **to have ~s of money** çoxlu pulu olmaq; **~s of people** hədsiz-hesabsız camaat; **~'s of times** dəfələrlə, min kərə/dəfə; *There is heaps more to say on this question Bu məsələ barədə hələ deməli çox şey var*;

◊ **to knock / to strike *smb.* all of a ~** son dərəcə heyrətləndirmək/çaşdırmaq/ karıxdırmaq

**heap²** [hi:p] *v* 1. *(həm də* **to ~ up/together)** qalamaq, tığ vurmaq, üst-üstə qalamaq; **to ~ (up) stones** daşı üst-üstə qalamaq; 2. yığmaq, toplamaq; **to ~ up riches** var-dövlət toplamaq/yığmaq; **to ~ up facts/ names/dates in *one's* memory** həddindən çox faktları /adları /tarixləri yadda saxlamaq; 3. *(həm də* **to ~ with)** doldurmaq, qalamaq; **to ~ a plate with cherries** nimçəni albalı ilə qalamaq/ağzınacan doldurmaq; 4. tərif yağdırmaq; qərq etmək; **to ~ *smb.* with presents, to ~ presents upon *smb.*** bir kəsi hədiyyələrə qərq etmək; *They heaped insults on his memory Onlar onun xatirəsinə təhqirlər yağdırdılar*

**heaps** [hi:ps] *adv* çox, xeyli çox; **to feel ~ better** özünü xeyli yaxşı hiss etmək

**hear** [hıəʳ] *v (pt, pp* **heard** [hə:ʳd]) 1. eşitmək; *Deaf people cannot hear Kar adamlar eşidə bilmirlər; Did you hear him go out Sən/Siz onun bayıra çıxdığını eşitdinmi?/eşitdinizmi?; We listened but could hear nothing Biz qulaq asdıq, ancaq heç nə eşidə bilmədik*; 2. *(diqqətlə)* dinləmək, qulaq asmaq, müntəzəm olaraq dinləmək, daimi dinləyici olmaq; **to ~ a famous singer** məşhur müğənnini dinləmək; *Have you ever heard that song sung in Italian? Sən/Siz bu mahnını italyan dilində eşitmisənmi?/eşitmisinizmi?*; **to ~ a course of lectures** mühazirə kursu dinləmək; **to ~ a pupil his lesson** şagirddən dərsini soruşmaq; 3. rəsmi surətdə axıra kimi qulaq asmaq/dinləmək; **to ~ a deputation** nümayəndə heyətini qəbul etmək/ diqqətlə dinləmək; *Don't judge me before I've finished my explanation; hear me out, please Lütfən məni axıra qədər dinlə/dinləyin; izahatımı qurtarmamış məni mühakimə etmə/etməyin*; 4. *hüq.* məhkəmə istintaqı aparmaq, işə baxmaq *(məhkəmədə)*, araşdırmaq; *The case was heard last week İşə keçən həftə baxdılar (məhkəmədə); What judge will hear the case? İşə hansı hakim baxacaq?; The court heard the evidence Məhkəmə şahid ifadəsini dinlədi*; 5. eşitmək, bilmək, xəbər tutmaq; *I've never heard of him Mən onun haqqında heç nə eşitməmişəm/bilmirəm; I hear that you are going to the South Eşitmişəm/Deyirlər, cənuba getməyə hazırlaşırsan/hazırlaşırsınız*; 6. məktub / məlumat almaq, sorağı gəlmək; *How often do you hear from your brother? Sən/Siz qardaşından/qardaşınızdan nə vaxtdan bir məktub alırsan? / alırsınız? Qardaşının sorağı tez-tezmi gəlir?; We hear from our representative Bizim nümayəndəmiz xəbər verir...; Hoping to hear from you Sənin / Sizin məktubunu/məktubunuzu/cavabını/cavabınızı almaq ümidi ilə, Səbirsizliklə cavabını / cavabınızı gözləyirik*; 7. diqqət yetirmək, eşitmək, qulaq asmaq, razılaşmaq; *He heard my entreaty O mənim yalvarışlarıma diqqətlə qulaq asdı; She will not hear of my going O mənim getməyim haqqında eşitmək belə istəmir; He would not hear of it O heç vəchlə buna razı olmadı, O bunu eşitmək belə istəmədi; I won't hear of such a thing Mən bunu eşitmək belə istəmirəm*;

◊ *Hear! Hear! Düzdür! Düzdür! (çıxış edənə razılıq çağırışları)*; **to ~ the grass grow** müstəsna fəhm/duyum qabiliyyətinə malik olmaq, tükü tükdən ayırmaq/ seçmək

**heard** [hə:d] **hear** *felinin pt, pp formaları*

**hearer** ['hɪərə'] *n* dinləyici
**hearing** ['hɪərɪŋ] *n* **1.** eşitmə, eşitmə qabiliyyəti; *Her hearing is poor O, pis eşidir;* **hard of ~** ağır eşitmə; **2.** eşidilmə dairəsi; **to be within ~** eşitmə dairəsində olmaq; **to be out of ~** eşidilmə dairəsindən kənarda olmaq; *In some countries it is unwise to talk about politics in the hearing of strangers Bəzi ölkələrdə kənar şəxslərin eşidə biləcəyi dairədə siyasətdən danışmaq ağılsızlıqdır;* **3.** axıra kimi dinləmə; *He gained a hearing Onu axıra kimi dinlədilər, Ona öz fikrini axıra kimi bildirməyə imkan verildi;* **4.** *hüq.* məhkəmə dinləməsi, işə baxma *(məhkəmədə),* istintaq, sorğu-sual *(xüs. jüri iştirak etməyən məhkəmələrdə);* **~ of witnesses** şahidlərin dindirilməsi *(sorğu-sual edilməsi);* **preliminary ~** ilkin istintaq; **~ in camera** qapalı işə baxma; **5.** *pl* iclas/dinləmə protokolları *(hökumət və parlament komissiyalarının, ABŞ konqres komissiyalarının)*
**hearing-aid** ['hɪərɪŋ'eɪd] *n* qulaq/eşitmə cihazı
**hearsay** ['hɪəseɪ] *n* xəbər, şayiə, səs; *I don't believe it; it's merely hearsay Mən buna inanmıram; bu adicə şayiədir; Hearsay evidence is not accepted in law courts Başqasının dilindən eşidərək verilən ifadə məhkəmə tərəfindən qəbul edilmir;* **~ testimony** şayiəyə əsaslanan ifadə
**hearse** [hɜ:s] *n* **1.** katafalk, cənazə/ölü arabası; **2.** *arx.* tabut; **3.** gor, qəbir, məzar; **4.** qəbir daşı, başdaşı
**hearse-cloth** ['hə:sklɔ:θ] *n* qara rəngli tabut örtüyü
**heart** [hɑ:t] *n* **1.** ürək; *When a man's heart stops beating, he dies İnsanın ürəyi dayandıqda ölür;* **2.** könül, qəlb; **affectionate/ kind/ tender/ noble/ stony ~** sevən/ yumşaq/incə/nəcib/daş qəlb; **broken ~** sınıq qəlb; **big ~** geniş qəlb; **at ~, in *one's* ~** qəlbin dərinliyində; **from the bottom of *one's* ~** qəlbin dərinliyindən, səmimi qəlbdən; **to open / to pour out *one's* ~ to *smb.*** ürəyini bir kəsə açmaq; **to read people's ~s** adamların qəlbini oxumaq; *Her heart bleeds Onun qəlbi qan ağlayır, Onun qəlbindən qara qanlar axır;* **3.** hiss, məhəbbət, sevgi, duyğu, bağlılıq; **to lose/to give *one's* ~ to *smb.*** qəlbini bir kəsə vermək, bir kəsə könül vermək, birini sevmək; **to gain / to obtain *smb.'s* ~** birinin könlünü fəth etmək, ürəyini çalmaq; **to steal *smb.'s* ~** birinin könlünü oğurlamaq, qəlbini çalmaq; *Dear/Sweet heart Canım-ciyərim, Mehribanım, Əzizim;* **4.** cəsarət, mərdlik, qoçaqlıq, mətanət, ürəklilik, hünər, şücaət; **to take ~ (of grace), to pluck up (*one's*) ~** cürətlənmək, ürəklənmək, qeyrətə gəlmək, cəsarətlənmək; **to lose ~** ruhdan düşmək; **to give ~ to *smb.*** bir kəsi ruhlandırmaq/ ürəkləndirmək/cəsarətləndirmək; **to have the ~ to do / to say *smth.*** bir şeyi etməyə /deməyə cürət/cəsarət etmək; **5.** mərkəzi hissə, orta, özək, göbək; **in the ~ of the city** şəhərin mərkəzi hissəsində; **in the ~ of Africa** Afrikanın göbəyində/ mərkəzində; **in the ~ of summer** yayın ortasında/qızğın çağında; **~ of oak** palıdın özəyi; **the ~ of a cabbage** kələmin özəyi; **6.** məğz, mahiyyət, əsas mətləb; **at the ~ of *smth.*** bir şeyin əsasında/məğzində; **to get to the ~ of the matter** işin məğzinə varmaq, işin mahiyyətini axtarıb tapmaq; **to get to the ~ of the mystery** sirrin məğzinə/ mahiyyətinə varmaq;
◊ **~s and flowers** şirin danışma, sentimental söhbətlər; **~s of oak** Britaniya donanmasının gəmiləri və dənizçiləri; *Have a heart! Rəhm et/edin!;* **~ and soul** canla-başla; **~ and hand** məmnuniyyətlə; ehtirasla; odlu-alovlu; **with half a ~** yarıkönül, həvəssiz; **by ~** əzbərdən;**to get / to learn by ~** əzbərləmək, əzbərdən öyrənmək; **to be the ~ and soul of** ilhamvericisi olmaq *(cəmiyyətin və s.);* **to make *smb.'s* ~ leap** bir kəsin ürəyini titrətmək; **to break *smb.'s* ~** bir kəsin qəlbini/könlünü qırmaq/sındırmaq; bir kəsin qəlbinə / könlünə toxunmaq; **to cry *one's* ~ out** ağlayıb ürəyini boşaltmaq, doyunca ağlamaq; **to *one's* ~'s consent** ürəyi istədiyi qədər, doyunca; **to eat *one's* ~** ürəyini yeyib qurtarmaq, içini yemək; üzülmək; **to have *one's* ~ in the right place** xeyirxah/xoş niyyəti olmaq, xeyirxah adam olmaq; *My daughters are plain, but their hearts are in the right place Mənim qızlarım o qədər də gözəl deyil, ancaq onlar xeyirxahdırlar/ürəkləri təmizdir;* **to take *smth.* to ~** ürəyinə salmaq; *Poor little Sylvia! She took things awfully to heart Yazıq Silvia! O hər şeyi həddən çox ürəyinə salırdı;* **to have *one's* ~ in *one's* mouth** ürəyi ağzına gəlmək, ürəyi qopmaq/düşmək, ürəyi içinə düşmək; *My heart was in my mouth as I walked along with him Mən onunla yanaşı addımlarkən ürəyim içimə düşmüşdü;* **to bring *smb.'s* ~ into his mouth** bir kəsi bərk qorxutmaq, bir kəsin ürəyini içinə salmaq; **a sound that brought my ~ into my mouth** ürəyimi ağzıma gətirən/varlığımı titrədən bir səs; **to keep a good ~** ruhdan düşməmək; ümidsizliyə qapılmamaq; **to wear *one's* ~ upon/on *one's* sleeve** öz hisslərini gizlədə bilməmək/açıq-aydın büruzə vermək
**heart-ache** ['hɑ:teɪk] *n* **1.** ürək ağrısı; **2.** qəm, qüssə, iztirab, qəlb yanğısı, *məc.* ürək ağrısı
**heart-attack** ['hɑ:tə.tæk] *n* ürəktutma, ürəktutması, ürək böhranı / krizisi
**heart-beat** ['hɑ:tbi:t] *n* **1.** ürək döyünməsi; **2.** həyəcan, ürək döyüntüsü, təşviş
**heart-blood** ['hɑ:tblʌd] *n* **1.** həyat enerjisi; həyat; **2.** məhrəm /gizli duyğu/hiss; **3.** ən əziz / istəkli
**heart-break** ['hɑ:tbreɪk] *n* böyük kədər, dərin hüzn; ağır dərd; ürək yanğısı



**heart-breaking** ['hɑ:t.breɪkɪŋ] *adj* **1.** ürəkparçalayan, ürəksızladıcı; kədərləndirici; pərişanedici; **2.** *d.d.* cansıxıcı, bezikdirici, zəhlətökən, çox maraqsız; **~ job** çox maraqsız / zəhlətökən iş
**heart-broken** ['hɑ:t.broukn] *adj* qəlbiqırıq, qəlbisınıq; sinəsi / ürəyi dağlı; çox qəmli, pərişan/kədərli
**heartburn** ['hɑ:tbə:n] *n* **1.** ürək qıcqırması; **2.** = **heartburning**
**heart-burning** ['hɑ:t.bə:nɪŋ] *n* **1.** qısqanclıq; həsəd; **2.** *pl* övqattəlxlik, pərtlik, dilxorluq; narazılıq
**heart-disease** ['hɑ:tdɪ'zi:z] *n tib.* ürək xəstəliyi
**hearten** ['hɑ:tn] *v* **1.** bəyənmək, təqdir etmək; *(həm də* **to ~ up)** ürəkləndirmək, ürək vermək, cəsarətləndirmək; **2.** *arx.* gübrələmək *(torpağı)*
**heart-failure** ['hɑ:t.feɪljə] *n* **1.** ürək iflici/ dayanması; **2.** ürək çatışmazlığı/zəifliyi
**heart-felt** ['hɑ:tfelt] *adj* səmimi, ürəyin ən dərin guşəsində bəslənilmiş; **~ sympathy** hüsn-təvəccöh, səmimi hüsn-rəğbət
**heart-free** ['hɑ:tfri:] *adj* sevdasız, eşqdən-xali, vurulmamış, sevməmiş
**heartful** ['hɑ:tful] *adj* səmimi; ürək dolusu
**hearth** [hɑ:θ] *n* **1.** *(həqiqi və məc. mənada)* ocaq; **2.** ailə, dudman; **~ and home** ev, ailə; **3.** *məc.* mərkəz, ocaq; **4.** buxarının sal və ya kərpic döşənmiş yerliyi; **5.** *tex.* peçin dibi; domna peçinin aşağı hissəsi
**hearth-rug** ['hɑ:θrʌg] *n* buxarının qabağına salınan xalça, fərş
**heartily** ['hɑ:tɪlɪ] *adv* **1.** səmimiyyətlə, ürəkdən, səmimi qəlbdən; **to thank ~** səmimi qəlbdən/ürəkdən təşəkkür etmək; **2.** cəhdlə, səylə, qeyrətlə, cidd-cəhdlə; odlu-odlu, ehtirasla; iştaha ilə; **to set to work ~** cidd-cəhdlə/ehtirasla işə girişmək; **to eat ~** iştaha ilə yemək; **3.** çox, həddən artıq; *I am heartily glad that... Mən çox şadam ki...*
**heartiness** ['hɑ:tɪnɪs] *n* **1.** səmimilik; **2.** səy, cəhd, cidd-cəhd, coşğunluq, hərarət; **the ~ which he puts into his work** onun öz işinə sərf etdiyi səy/coşğunluq; **3.** sağlamlıq
**heartless** ['hɑ:tlɪs] *adj* **1.** daşürəkli, rəhmsiz; insafsız, vicdansız; qəddar, zalım, amansız; **a ~ ruler** daşürəkli/zalım/qəddar/amansız hökmdar; **~ fraud** amansız yalan; **2.** bəhərsiz, barsız, məhsul verməyən *(torpaq haq.)*
**heart-murmur** ['hɑ:t.mə:mə'] *n tib.* ürək küyü
**heart-quake** ['hɑ:tkweɪk] *n* **1.** ürək döyüntüsü / çırpıntısı; **2.** birdən titrəmə; lərzə, əsmə *(həyəcandan və s.)*
**heart-rending** ['hɑ:t.rendɪŋ] *adj* ürəksızladıcı, ürəkparçalayan, dəhşətli; **~ cries** dəhşətli çığırtı, ürəkparçalayan qışqırıq
**heartsease** ['hɑ:tsi:z] *n* **1.** *arx.* dinclik, əmin-amanlıq; **2.** *bot.* alabəzək bənövşə
**heart-service** ['hɑ:tsə:vɪs] *n* sədaqət, səmimilik, açıqürəklilik
**heart-to-heart** ['hɑ:ttə'hɑ:t] *adj* məhrəm, səmimi, çox yaxın; **~ talk** səmimi söhbət
**heartwarming** ['hɑ:t.wɔ:mɪŋ] *adj* fərəhli, sevindirici, ürəkaçan; xoş; valehedici, təsirli; **most ~ literary event of the year** ilin ən sevindirici ədəbi hadisəsi
**hearty** ['hɑ:tɪ] *adj* **1.** səmimi; dostyana, mehriban; **to give *smb.* a ~ welcome** bir kəsi səmimi qarşılamaq; **~ welcome** səmimi qəbul; **2.** sağlam; çalışqan, fəal, səyli; **a ~ fellow** sağlam oğlan; *He is seventy but still hale and hearty Onun yetmiş yaşı var, ancaq o hələ də gümrah və sağlamdır;* **3.** bərk, ağır, şiddətli; **~ curse** bərk söyüş; *Then came the rain in a hearty flood Sonra şiddətli yağış şırıltı ilə tökdü;* **4.** bol; doyumlu, tutumlu, yaxşı *(yemək, xörək haq.);* **~ appetite** yaxşı iştaha; **to eat a ~ meal** doyunca yemək; **5.** məhsuldar *(torpaq haq.);* **~ land** məhsuldar torpaq
**heat**¹ [hi:t] *n* **1.** isti, çox/bərk isti, bürkü; **summer ~** yay istisi/bürküsü; **to suffer from the ~** istidən/bürküdən əziyyət çəkmək; *The thermometer shows 30 degrees of heat Termometr 30 dərəcə istilik göstərir; The heat was stifling / suffocating Hava bürkü idi; İsti adamı boğurdu;* **2.** hərarət, yüksək istilik; **fever ~** qızdırma istisi; *Her face flushed with sudden heat Ani hərarətdən onun üzü od tutub yandı;* **3.** *tex.* qızma, qızma sahəsi, közərmə, közərmə dərəcəsi; **red ~** qıpqırmızı qızdırma/qızma, **white ~** ağarana qədər qızdırma/qızma *(metalı);* **to raise iron to a white ~** dəmiri ağarana qədər qızdırmaq; **4.** coşğunluq, qızğınlıq, hərarət, həvəs; **to speak with considerable ~** çox həvəslə danışmaq; **in the ~ of the debate/ argument** müzakirənin/mübahisənin qızğın çağında; **in the ~ of passion** ehtiraslar qızanda/coşanda; *I said it in the heat of the moment Mən bunu hirslənən anda dedim;* **to get into a fearful state of ~** özündən çıxmaq; qəzəblənmək, hirslənmək; **to cool *one's* ~** hirsini soyutmaq; **at (a) white ~** cinlənəndə, cin atına minəndə, cin başına vuranda, özündən çıxanda; **5.** bir dəfəyə/dəfədə, bir oturuma/oturumda *(edilən nə isə);* **at a ~** bir oturuma, bir dəfəyə; **final ~** final yürüşü/qaçışı; **6.** cərə axıtma, hövrə / kürsəyə gəlmə *(heyvanlar haq.);* **to be on/in/at ~** hövrə / kürsəyə gəlmək
**heat**² [hi:t] *v* **1.** qızdırmaq, isindirmək, istiləndirmək *(həm də* **to ~ up);** **to ~ up some water** bir az su qızdırmaq; **2.** qızmaq, qızışmaq, isinmək; **to ~ oneself by running** qaçaraq qızışmaq; *The water here heats slowly Su burada yavaş-yavaş qızır;* **3.** acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək, qıcıqlandırmaq, hiddətləndirmək; **to get ~ed in a dispute** mübahisədə əsəbiləşmək; *His arrogance heats me beyond*

endurance Onun lovğalığı məni cin atına mindirir / dəli eləyir

**heated** ['hi:tɪd] adj 1. qızdırılmış, isidilmiş; ~ term amer. ilin isti vaxtı; 2. əsəbiləşdirilmiş, qızışdırılmış, acıqlandırılmış; 3. coşğun, qızğın, ehtiraslı; ~ imagination coşğun təxəyyül; ~ discussion qızğın müzakirə

**heatedly** ['hi:tɪdlɪ] adv 1. hərarətlə, ehtirasla, od-lu-alovlu; 2. qəzəblə, qeyzlə, acıqlı-acıqlı

**heater** ['hi:tər] n peç, soba; qızdırıcı cihaz; radiator (qızdırıcı)

**heath** [hi:θ] n 1. çöl, bozqır, step, boz yer, məndəcər yer (xüs. süpürgə kolu ilə örtülmüş); 2. bot. süpürgə kolu

**heath-bell** ['hi:θbel] n süpürgə kolu çiçəyi

**heath-cock** ['hi:θkɔk] n zool. tetra quşu; meşə xoruzu

**heathen**[1] ['hi:ðən] n 1. bütpərəst, dinsiz, kafir; the ~ bütpərəstlər; The Saxons who invaded England were heathens İngiltərəni işğal edən Saksonlar bütpərəst idilər; 2. d.d. barbar, vəhşi; They've allowed their daughter to grow up as a young heathen Onlar qızlarına barbar, nadan kimi böyüməyə imkan vermişlər; 3. avam, cahil/bisavad adam

**heath-cock** ['hi:θkɔk] n erkək tetra (quş)

**heathen**[2] ['hi:ðən] adj 1. bütpərəstlik; ~ customs bütpərəstlik adətləri/ənənələri; 2. allahsız, allaha inanmayan; 3. vəhşi, cahil, nadan, avam

**heathenism** ['hi:ðənɪzm] n bütpərəstlik, barbarlıq, vəhşilik; vandalizm, mədəniyyətsizlik

**heather** ['heðər] n 1. bot. süpürgə kolu; 2. bataqlıq, süpürgə kolu ilə örtülmüş bozqır;
◊ to take to the ~ quldur / soyğunçu olmaq; Şotlandiya dağlarında gizlənmək

**heathery** ['heðərɪ] adj süpürgə kolu basmış

**heath-hen** ['hi:θhen] n dişi tetra

**heath-pea** ['hi:θpi:] n bot. lərgə, güllücə

**heating**[1] ['hi:tɪŋ] n 1. qızışma, qızma; ~ of manure peyinin qızışması, peyinin öz-özündən qızışıb yanması; 2. istilik, isitmə; central ~ mərkəzi istilik sistemi; hot air ~ isti hava vasitəsilə isitmə

**heating**[2] ['hi:tɪŋ] adj qızdırma, isitmə; qızdırıcı, isidici; ~ apparatus qızdırıcı cihaz; ~ drink tünd spirtli içki

**heating plant** ['hi:tɪŋ'pla:nt] n istilik qurğusu / sistemi

**heat-lightning** ['hi:t'laɪtnɪŋ] n üfüqdə parıltı; çox uzaqdan görünən şimşək parıltısı

**heatproof** ['hi:tpru:f] adj tex. istiliyə/qızmaya davamlı; istilik buraxmayan, hərarəti sabit saxlayan

**heat-spot** ['hi:tspɔt] n çil (dəridə, üzdə)

**heat-stroke** ['hi:tstrouk] n isti vurma, istiyə düşmə

**heat-wave** ['hi:tweɪv] n 1. fiz. istilik dalğası; 2. ən isti çağ / dövr

**heave**[1] [hi:v] n 1. qalxma; 2. qabarma, qalxıb-enmə (dəniz, köks və s. haq.); 3. torpağın şişməsi; 4. pl bayt. xəfəng (at və başqa heyvanlarda ciyər xəstəliyi)

**heave**[2] [hi:v] v (pt, pp heaved, hove) 1. (həm də to ~ up) qaldırmaq; to ~ an axe baltanı qaldırmaq; We heaved him to his feet Biz onu ayağa qaldırdıq; 2. dən. qaldırmaq, çıxartmaq, dartmaq; to ~ up the anchor lövbəri qaldırmaq; to ~ in a cable burazı /kanatı dartmaq; 3. atmaq, tullamaq, tolazlamaq; to ~ smth. overboard bir şeyi göyərtədən atmaq (suya); to ~ a brick kərpici tolazlamaq; 4. qaldırmaq və endirmək, qabartmaq; The wind heaves the waves Külək dalğaları qabardır; 5. qalxmaq və enmək, qabarmaq; Her bosom heaves with sobs Hönkürtüdən onun köksü qalxıb-enir; 6. inilti səsi çıxartmaq; 7. gücənmək, hıqqanmaq (qusarkən); ~ ahead dən. irəliləmək; ~ out dən. yelkənləri qaldırmaq; The ship hove out of the harbour Gəmi tərsanəni tərk etdi;
◊ to ~ in the sight üfüqdə görünmək

**heave ho** ['hi:v'hou] int. ≅ Ya Əli! Bir-iki-üç! (dənizçilərin kəndiri və ya burazı dartarkən çıxartdıqları səs)

**heaven** ['hevn] n 1. göy, səma; göy qübbəsi; starry ~ ulduzlu səma; to search the ~s with a telescope teleskop vasitəsilə səmanı müşahidə etmək; 2. din. haqq dünyası, haqqın dərgahı, cənnət; the kingdom of ~s haqq dünyası; He is in heaven O, haqq dünyasındadır; 3.: merciful Heaven mərhəmətli Allah; righteous Heaven ədalətli Allah; It was the will of Heaven Bu, Allahın hökmü imiş, Allahın hökmü belə imiş;
◊ Heaven forbid! Allah göstərməsin!, Allah uzaq eləsin; By Heaven! Allah haqqı, Vallah!; Heavens! İlahi!; Ay Allah!, Allah, Allah!; For Heaven's sake! Allah xatirinə!; Sən/Siz Allah!

**heaven-gate** ['hevngeɪt] n behiştin qapısı

**heavenly** ['hevnlɪ] adj 1. müqəddəs; səmavi; ~ angel səmavi mələk; ~ spirit müqəddəs ruh; the ~ City, the ~ Jerusalem din. müqəddəs /qüdsal şəhər; yeni Qüds (şəhəri); 2. ilahi, valehedici, xariqüladə, müstəsna, pak; ~ beauty ilahi gözəllik; ~ thoughts pak məramlar / fikirlər; 3. astr. göy, səmavi; ~ bodies göy cisimləri; ~ influence atmosfer təsiri

**heaver** ['hi:vər] n 1. malyükləyən, yükvuran fəhlə; 2. tex. qapan (tərəzi); ling, rıçaq (ağır şeyləri qaldırmaq üçün); 3. jarq. oğru, xırda şey oğrusu

**heavily** ['hevɪlɪ] adv 1. ağır, ağır surətdə; bərk; a ~ loaded car ağır yüklənmiş maşın; to hang ~ on smb.'s arm bir kəsin qolundan daş kimi sallanmaq; to press ~ bərk basmaq; 2. çətinliklə, əzabla, acı-acı; to complain ~ acı-acı gileylənmək; to take the news ~ xəbərə çətinliklə dözmək; 3. yavaş-yavaş, güclə, ağır-ağır; to walk ~ ağır-ağır/güclə yerimək; They walked heavily Onlar güclə yeriyirdilər; Time passes heavily Vaxt ağır-ağır keçir; 4. güclü, şiddətli, çox; It's raining heavily Şiddətli yağış yağır; ~ wooded sıx bitmiş (meşə); to drink ~ çox içmək; to be punished ~ şiddətli cəzalandırılmaq; to sleep ~ dərin yuxuya getmək, bərk yatmaq



**heaviness** ['hevɪnɪs] n 1. ağırlıq; growing ~ artan ağırlıq; ~ in the head başda ağırlıq; 2. lənglik; ~ of movement hərəkətin ləngliyi; 3. süstlük, ölüvaylıq, kəsalət; curious ~ qəribə süstlük; 4. məyusluq, ruh düşkünlüyü; to be seized with ~ ruh düşkünlüyünə qapılmaq, dilxor olmaq; ~ of heart ürək sıxıntısı, qüssə, kədər, nisgil, qəm-qüssə, qəm-kədər

**heavy**[1] ['hevɪ] adj 1. ağır, ağırçəkili; ~ load ağır yük; Lead is a heavy metal Qurğuşun ağır metaldır; ~ train ağır yük qatarı; to be ~ ağır olmaq; It is too heavy for me to lift Bunu qaldırmaq mənim üçün çox ağırdır; 2. güclü, qüvvətli, böyük, ağır; ~ motor güclü mühərrik, motor; ~ industry ağır sənaye; ~ armament ağır silah; ~ artillery ağır artilleriya; ~ bomber / tank ağır bombardmançı təyyarə/tank; 3. böyük, zor, yüksək; ~ debts böyük borclar; ~ taxes yüksək vergilər; ~ price yüksək qiymət; 4. şiddətli, güclü, intensiv, gərgin; ~ fire şiddətli atəş; ~ traffic intensiv/ gur küçə hərəkəti; a ~ cold ağır zökəm / tumov; ~ applause sürəkli alqış; ~ rain güclü yağış; ~ sleep dərin yuxu; He is a heavy sleeper O, daş kimi yatır; He is a heavy drinker O, içki düşkünüdür; 5. bol, çoxlu, zəngin; qatı, sıx; ~ crop bol məhsul; ~ supper zəngin şam yeməyi; a ~ fall of snow ağır/bərk qar yağma/düşmə; ~ beard sıx saqqal; ~ fog qatı duman; ~ seeding k.t. sıx səpilən taxıl; sıx aparılan səpin; 6. çətin, ağır; ~ work çətin iş; ~ day ağır gün (işlə yüklənmiş); ~ breathing ağır / çətin nəfəsalma; ~ wound ağır yara; ~ loss ağır itki; ~ fate qara/acı tale; ~ news qara / acı xəbər; ~ silence dərin / əzablı sükut; 7. dik, sərt; çala-çuxur (yol, eniş və s. haq.); ~ gradient sərt eniş və ya yoxuş; ~ road çala-çuxur yol; 8. tutqun, buludlu; ~ sky buludlu səma; ~ clouds qara buludlar;
◊ ~ repair əsaslı təmir; ~ parts teatr. faciə rolları; to come the ~ father ciddi tərzdə öyüd-nəsihət vermək; ~ metal məc. ağır adam, çox ağıllı adam; to have a ~ hand 1) ləng olmaq; 2) sərt/acıqlı olmaq; to be ~ in hand tərs olmaq (at haq.); to be ~ on hand 1) ağır/yavaş-yavaş keçmək (vaxt haq.); 2) maraqsız, darıxdırıcı olmaq (söhbət, həmsöhbət haq.)

**heavy**[2] ['hevɪ] adv ağır, ağır surətdə; This burden lies heavy on the nation Bu ağır yük xalqın üzərindədir; Those goods lay heavy on his hand Bu malları o, başından eləyə bilmədi; to look ~ süst görünmək; keyləşmək; Time hangs heavy Vaxt sanki dayanıb, Vaxt çox yavaş-yavaş keçir

**heavy-armed** ['hevɪ'a:md] adj ağır silahla silahlanmış, ağır silahlı

**heavy-duty** ['hevɪ'dju:tɪ] adj 1. çox davamlı; 2. yüksək gömrük rüsumu qoyulmuş; 3. tex. ağır tipli; ağır iş rejimi üçün nəzərdə tutulmuş; 4. çox güclü

**heavy-handed** ['hevɪ'hændɪd] adj d.d. 1. ağır, ləng, ağırtərpənən, bacarıqsız; 2. zalım, müstəbid, amansız, daşürəkli, qəddar, rəhmsiz, insafsız; 3. əldən / haldan düşmüş, üzgün, yorğun

**heavy-headed** ['hevɪ'hedɪd] adj 1. küt, korazehin, kütbeyin; 2. yekəbaş, danabaş, qanmaz; 3. süst, kəsalət basmış

**heavy-hearted** ['hevɪ'ha:tɪd] adj 1. qəmli, qüssəli, dərdli, kədərli; 2. həvəssiz, könülsüz, ürəksiz

**heavy-laden** ['hevɪ'leɪdn] adj 1. ağır yüklənmiş; 2. məzlum; məyus edilmiş; əzilmiş, sarsıdılmış

**heavy-water** ['hevɪ'wɔ:tər] n ağır su

**heavy-weight** ['hevɪ'weɪt] n 1. id. ağırçəkili boksçu / pəhləvan; 2. ağır gəmi; ağır yük maşını; 3. amer. jarq. görkəmli xadim

**hebetate** ['hebɪteɪt] v 1. kütləşdirmək (əqli qabiliyyəti); 2. səfehləmək, səfehləşmək

**hebetude** ['hebɪtjud] n korazehinlik, kütlük, şüurun pozulması, letargiya

**Hebraic** [hi:'breɪɪk] adj qədim yəhudilərə məxsus; qədim yəhudi dilinə məxsus

**Hebrew**[1] [hi:'bru:] n 1. yəhudi; 2. qədim yəhudi dili; 3. ivrit, İsrail dövlətinin rəsmi dili

**Hebrew**[2] ['hi:bru:] adj yəhudi, qədim yəhudi; ~ calendar qədim yəhudi təqvimi; of ~ extraction yəhudi mənşəli

**heck** [hek] n qapı sürgüsü

**heckle** ['hekl] v suallar yağdırmaq; tənqidi mülahizə/məzəmmət yağdırmaq (xüs. seçkiqabağı toplantılarda); to ~ the Socialist candidate Sosialist partiyasından olan namizədə suallar yağdırmaq

**hectare** ['hekta:r] n hektar

**hectic**[1] ['hektɪk] n 1. = hectic fever; üzücü / hektik qızdırma; 2. qızdırma qızartısı; 3. vərəmli xəstə

**hectic**[2] ['hektɪk] adj 1. vərəmli, vərəm xəstəliyi olan; ~ patient vərəmli xəstə; ~ fever tib. vərəm qızdırması; ~ cough vərəm öskürəyi; 2. d.d. qızğın, qaynar; həyəcanlı, coşğun, təlatümlü; ~ time qızğın çağ; to lead a ~ life coşğun/təlatümlü həyat sürmək; for one ~ moment bir həyəcanlı an üçün

**hecto-** [hektou-] (həm. hekto, hect, hekt) hekto.. (mürəkkəb sözlərin "yüz, yüz dəfə" mənasında olan birinci komponenti): hectogram(me) hektoqram (yüz qram); hectometre hektometr (yüz metr); hectowatt hektovat (yüz vat); hectograph hektoqraf (yazıdan surət çıxaran cihaz)

**hector**[1] [hektər] n 1. davakar, dalaşqan, öcəşkən, sataşqan, xuliqan; 2. lovğa, gopçu, özünü öyən

**hector²** [hektə<sup>r</sup>] *v* **1.** hədələmək, hədə-qorxu gəlmək; öcəşmək; sataşmaq, dava etmək; **2.** lovğalanmaq, özünü öymək, gopa basmaq
**he'd** [hi:d] *d.d.* **he had** *və* **he would**-*un qısa forması*
**hedge¹** [hedʒ] *n* **1.** canlı çəpər *(ağaclardan və kollardan ibarət sıx çəpər / hasar)*; **quickset / green ~** canlı çəpər; **dead ~** hörmə çəpər; **prickly ~** tikanlı çəpər; **to trim a ~** canlı çəpəri budamaq *Will this hedge keep the sheep in the field? Bu çəpər qoyunları otlaqda saxlayacaqmı?*; **2.** sədd, əngəl, manеə; **~s of policemen** polis səddi; **3.** çərçivə, dairə, məhdudiyyət; **a ~ of etiquette** etiket/təşrifat çərçivəsi; **a ~ of convention** adətənənədən irəli gələn məhdudiyyət;
◊ **by ~ or by stile** necə olursa olsun, hansı yolla olursa olsun; **over ~ and ditch** düz, düppədüz, düzünə, birbaşa, kəsə yolla; **to sit on the ~** gözləmək, bitərəfliyi gözləmək, tərəddüd etmək; ≅ küləyin haradan əsəcəyini gözləmək; **to take a sheet off a ~** günün günorta çağı oğurluq etmək, açıq-açığına çapıb talamaq; *Hedges have eyes and walls have ears at. söz.* ≅ *Divarın da qulağı var*
**hedge²** [hedʒ] *v* **1.** canlı çəpər salmaq *(yaşıl ağac/kol əkməklə)*; çəpərləmək; **to ~ a road** yolun kənarlarına yaşıl kollar əkmək; **2.** yaşıl/canlı çəpəri budamaq; **3.** hasarlamaq, hasara almaq; **to ~ a field** sahəni/tarlanı hasara almaq; **4.** hasarla ayırmaq (*həm də* **to ~ in/ off**); **to ~ a piece of ground** torpaq sahəsini hasarla ayırmaq; **5.** *məc.* əngəl/manеə yaratmaq, məhdudiyyət qoymaq, çətin vəziyyətə salmaq; **to ~ *smb.* in with rules and regulations** qaydalar və təlimatlarla bir kəsin fəaliyyətini məhdudlaşdırmaq; **to ~ *smb.'s* path with difficulties** bir kəsin yolu üzərində manеələr ucaltmaq; **6.** boyun /baş qaçırmaq; yayınmaq, özünü kənara çəkmək, nala-mıxa vurmaq, azdırmaq; *Answer "yes" or "no" - don't hedge Nala, mıxa vurma/vurmayın - ya "hə" de/deyin, ya "yox"; Don't hedge! What's wrong? Azdırma/Azdırmayın bizi! Açıq de/deyin görüm, nə olub?*
**hedge-bill** ['hedʒbıl] *n* = **hedging-bill**
**hedgehog** ['hedʒhɔg] *n* **1.** *zool.* kirpi; **2.** *amer.* oxlu kirpi; **3.** *d.d.* yola getməyən / qılıqsız / bədrəftar adam; **4.** *hərb.* kirpi *(tikanlı məftildən daşına bilən çəpər)*
**hedgehop¹** ['hedʒhɔp] *n av. d.d.* alçaqdan uçuş *(təyyarənin üfüqi istiqamətdə alçaqdan uçuşu)*
**hedgehop²** ['hedʒhɔp] *v av. d.d.* alçaqdan uçmaq, lap yer ilə uçmaq
**hedge-marriage** ['hedʒ.mærıdʒ] *n* məxfi nikah
**hedge-pig** ['hedʒpıg] *n* = **hedgehog**
**hedgepress** ['hedʒpres] *n* **1.** gizli dövri mətbuat; **2.** gizli mətbəə
**hedgepriest** ['hedʒpri:st] *n* savadsız keşiş
**hedge-rose** ['hedʒrouz] *n bot.* itburnu

**hedge-school** ['hedʒsku:l] *n* **1.** çox kasıb ibtidai məktəb; **2.** kasıblar üçün açıq havada məktəb *(tarixən İrlandiyada mövcud olub)*
**hedge-shears** ['hedʒʃıəz] *n* bağ qayçısı
**hedge-sparrow** ['hedʒ.spærou] *n zool.* torağay, bağ torağayı *(quş)*
**hedge-writer** ['hedʒ.raıtə<sup>r</sup>] *n* cızma-qaraçı, qaralamaçı, dəyərsiz yazıçı
**hedging-bill** ['hedʒıŋbıl] *n* bağ bıçağı; dəhrə
**hedonism** ['hi:dənızm] *n fəls.* **1.** gedonizm *(həyatın zövq və səfa üçün yaranmış olduğunu iddia edən qədim yunan əxlaq nəzəriyyəsi)*; **2.** həyat eşqi, nəşələnmə ehtirası
**hedonist** ['hi:dənıst] *n* gedonist, gedonizm tərəfdarı *(bax:* **hedonism)**
**hedonistic** [.hedə'nıstık] *adj fəls.* gedonistik
**heebie-jeebies** ['hi:bı'dʒi:bız] *n* **1.** *jarq.* son dərəcə həyəcanlı/əsəbi vəziyyət; **to have the ~** özünə yer tapa bilməmək, cin təpəsinə vurmaq, cinlənmək; **to give the ~** yolundan çıxarmaq, dəli etmək; **2.** ekssentrik / məzəli rəqs
**heed¹** [hi:d] *n* **1.** diqqət, ehtiyat, ehtiyatlılıq; **to take ~** ehtiyatlı olmaq, özünü gözləmək/qorumaq; *Take heed! Diqqət! Ehtiyatlı ol!/olun!; Take heed of what you say! Sözünü/Sözünüzü bil!/bilin! Nə dediyinə fikir ver!/verin!*; **to take ~ of, to pay/to give ~ to** diqqət vermək/yetirmək; nəzərə almaq, fikir vermək, məhəl qoymaq *(məsləhətə və s.)*; *He didn't pay any heed to the girl's advice O, qızın məsləhətinə heç məhəl qoymadı*; **to take no ~ of danger** təhlükəyə qətiyyən məhəl qoymamaq; **2.** diqqət obyekti
**heed²** [hi:d] *v* diqqət etmək, fikir vermək, nəzərə almaq, məhəl qoymaq; **to ~ a warning** xəbərdarlığı nəzərə almaq; *Heed what I say Mən nə deyirəm, onu nəzərə al/alın; A horse heeds neither bit nor spur At nə yüyənə, nə də mahmıza məhəl qoyur*
**heedful** ['hi:dful] *adj* **1.** diqqətli, qayğıkeş; *Be more heedful of advice Məsləhətə daha diqqətli ol*; **2.** ehtiyatlı
**heedless** ['hi:dlıs] *adj* diqqətsiz, saygısız, diqqət etməyən, fikir verməyən, ehtiyatsız, tədbirsiz; *He was always heedless of advice O heç vaxt məsləhətə qulaq asmayıb*
**hee-haw¹** ['hi:'hɔ:] *n* **1.** anqırma *(eşşəyin)*; **2.** qaqqıldama, gurultulu kobud gülüş; **3.** *jarq.* uzunqulaq
**hee-haw²** ['hi:'hɔ:] *v* **1.** anqırmaq *(eşşək haq.)*; **2.** bərkdən gülmək; *məc.* at kimi kişnəmək, qaqqıldamaq *(gülmək mənasında)*
**heel¹** [hi:l] *n* **1.** daban; **2.** corabın dabanı; ayaqqabının dalı; **3.** mahmız, şpor *(quşlarda)*; **4.** ayaqqabı dabanı; **high ~s** hündür daban; **low ~s** yastı / alçaq daban; **to click *one's* ~s** dabanlarılə şıqqıldatmaq *(rəqs edərkən və s.)*; **5.** dırnağın dalı *(bəzi məməli heyvanlarda)*; **cloven ~s** ha-



çalanmış dırnaq; **to fling out *one's* ~s** şıllaq / təpik atmaq, şıllaqlamaq;
◊ **heavy ~** olmazın zülmü; **the iron ~** dəmir daban; **under the ~ of a cruel / ruthless tyrant** qəddar müstəbidin zülmü altında; **neck and ~s** başdan ayağa, təpədən dırnağa; **~s over head, head over ~s 1)** kəlləmayallaq; **2)** başıüstə, təpəsiüstə, tələsik *(gəlmək)*; **to go ~s over head** kəlləmayallaq gəlmək, təpəsiüstə getmək; **to be at/on/upon *smb.'s* ~** dalınca/ ardınca/ dabanbasma getmək; haqlamaq; *The thief ran off with an angry crowd at his heels Qəzəblənmiş camaat oğrunun ardınca daban-dabana qaçırdı; Famine often follows on the heels of war Aclıq əksər hallarda müharibədən sonra başlayır /düşür*; **to bring *smb.* to ~** bir kəsə tabe olmağa məcbur etmək; **to have the ~s of *smb.*** bir kəsi ötüb keçmək; **to clap/to lay *smb.* by the ~s** bir kəsi yaxalamaq/həbs etmək; **to cool *smb.'s* ~s** əbəs yerə gözləmək; **to take to *one's* ~s** sivişib aradan çıxmaq, daban almaq, götürülmək; **to show a clean pair of ~s** dabanına tüpürüb aradan çıxmaq, *məc.* üstünə qoymaq; **to have *one's* heart at *one's* ~s** ürəyi düşmək, bərk qorxmaq; *Disasters come treading on each other's heel at. söz. Bəla bəla üstündən gələr, Bəlanın biri gəldimi, digərlərindən Allah saxlasın*
**heel²** [hi:l] *v* I **1.** daban vurmaq *(ayaqqabıya)*, **to sole and ~ a pair of boots** botinkaya pəncə və daban vurmaq, alt salmaq; **2.** dabanlarla taktla tıqqıldatmaq; **3.** bir kəsin dalınca / ardınca getmək; **4.** *amer. jarq.* pulla təmin etmək; **5.** *id.* topu dabanla vurmaq *(futbolda)*; **to ~ in** müvəqqəti üzdən basdırmaq, torpaqla örtmək *(bitkini əkənə qədər)*
**heel** [hi:l] *v* II **1.** *dən.* əyilmək, yana yatmaq; **2.** əymək, yana yatırtmaq *(gəmini)*
**heel-and-toe** ['hi:lən'tou] *adj*: **~ walk** idman yerişi
**heel-and-toe roll** ['hi:lən'tou'roul] *n id.* bədənin ağırlığını tədricən pəncədən barmaqların ucuna salma üsulu
**heeled** ['hi:ld] *adj* **1.** dabanlı; **2.** nallanmış, nallı; **3.** *amer. jarq.* tapança ilə silahlanmış; **4.** pulla təmin olunmuş
**heeler** ['hi:lə<sup>r</sup>] *n* **1.** daban vuran usta *(ayaqqabıya)*; **2.** *amer.* partiya rəhbərinin/siyasi xadimin qabdibi yalayanı; *nifr.* müftəxor, qabdibi yalayan; **3.** çuğul, satqın, xain, dönük; **4.** döyüşkən xoruz
**heeling** ['hi:lıŋ] *n dən.* əyilmə, yana əyilmə
**heelless** ['hi:llıs] *adj* dabansız *(ayaqqabı)*
**heeltap** ['hi:ltæp] *n* **1.** daban *(ayaqqabı dabanının alt qatı)*; **2.** içilmiş badənin dibində qalan şərab; *No heeltaps! Axıra qədər iç!/için! Dibinə qədər iç!/için!*
**heel-tendon** ['hi:l'tendən] *n anat.* Axilles vətəri

**heft¹** [heft] *n* **1.** *amer.* çəki, ağırlıq; **2.** *d.d.* əsas hissə, böyük qisim; *The heft of the crop was spoiled Məhsulun böyük bir qismi xarab oldu/korlandı*; **3.** *amer.* nüfuz; təsir; mühümlük, əhəmiyyət
**heft²** [heft] *v* **1.** çəkisini müəyyən etmək *(qaldırmaqla)*; **2.** çəkmək *(tərəzidə)*
**hefty** ['heftı] *adj* **1.** *d.d.* böyük, iri, yekəpər, zorba; **~ fellow** zorba oğlan; *He is a hefty farm worker O, sağlam və güclü ferma fəhləsidir*; **2.** güclü; *He struck a hefty blow O, güclü zərbə endirdi*; **3.** *amer. d.d.* ağır
**hegemon** ['hıgəmən, 'hedʒımən] *n* hegemon
**hegemonic** [.hi:gı'mɔnık, .hedʒı'mɔnık] *adj* hegemon, əsas, aparıcı
**hegemony** [.hi:'geməni, 'hedʒıməni] *n* hegemonluq
**Hegira, Hejira** ['hedʒırə, hı'dʒaırə] *n* **1.** hicrət *(Məhəmməd peyğəmbərin Məkkədən Mədinəyə hicrəti)*; **2.** Hicri tarixinin başlanğıcı; **3.** *məc.* qaçaqaç, yola düşmə, köçüb getmə
**he-goat** ['hi:gout] *n* təkə, dıbır, erkək keçi
**heifer** ['hefə<sup>r</sup>] *n* **1.** düyə; **2.** *amer. d.d.* arvad, qadın
**heigh** [heı] *int.* **1.** *(həvəsləndirmə, sevinc, təəssüf və başqa hissləri ifadə edir)* afərin, maşallah, a, aha, hə, ba, vay; **2.** hey, ey, ay! *(çağırış)*
**heigh-ho** ['heı'hou] *int. (Pərtlik, dilxorluq, peşmançılıq, təəssüf və s. ifadə edir)*: Əfsus!, Heyf!, Ah!, ah-uf!, Vay-vay!
**height** [haıt] *n* **1.** hündürlük, ucalıq, yüksəklik; **the ~ of the building** binanın hündürlüyü; **wall six feet in ~** altı fut hündürlüyündə divar; **giddy ~** başgicəlləndirən yüksəklik; **2.** boy; *What is your height? Boyun nə qədərdir?; I am six feet in height Boyum altı futdur (2,09 m)*; **3.** dəniz səviyyəsindən… yüksəklikdə; **4.** təpə, uc, baş, kəllə; zirvə; *They finally reached the height of the mountain Nəhayət onlar dağın zirvəsinə çatdılar/yetişdilər*; **on the mountain ~** dağın kəlləsində; **5.** ən yüksək nöqtə/dərəcə; ən qızğın çağ; **the ~ of his genius** onun dühasının çiçəklənmə çağı; **in the ~ of the season** mövsümün qızğın çağında; *The storm was at its height Fırtına son həddə çatmışdı*
**heighten** ['haıtn] *v* **1.** artırmaq, ucaltmaq, gücləndirmək; **to ~ effect** təsiri gücləndirmək; **to ~ interest in *smth.*** bir şeyə marağı artırmaq; **to ~ *smb.'s* anger** bir kəsin qəzəbini artırmaq; **2.** artmaq, güclənmək, ucalmaq; *Her anxiety heightened Onun həyəcanı artdı; Her illness was heightened by anxiety Təlaş onun xəstəliyini gücləndirdi/ağırlaşdırdı*; **3.** mübaliğə etmək, şişirtmək; **to ~ description** təsvirdə mübaliğəyə yol vermək
**height-indicator** ['haıt'ındıkeıtə<sup>r</sup>] *n* altimetr *(ucalığı təyin edən alət)*
**heinous** ['heınəs] *adj* çox pis, çirkin, iyrənc, mənfur, rəzil, alçaq, qəbih, əclaf; **~ crime** iy-

rənc / mənfur / alçaq cinayət; ~ **charge** dəhşətli / mənfur ittiham

**heir**[1] [eəʳ] *n* varis, vərəsə; ~ **general** hüquqi /qanuni varis; ~ **presumptive** təxmin olunan varis; *The eldest son is usually the heir Adətən böyük oğul varis olur; Who is the heir to the throne? Taxt-taca varis kimdir?*; **joint** ~ *hüq.* ortaq vərəsə, miras şəriki; **to make** *smb. one's* ~ bir kəsi özünə varis təyin etmək

**heir**[2] [eəʳ] *v* irsən almaq/ varis olmaq

**heir-at-law** ['eərət'lɔ:] *n* (*pl* **heirs-** [eəz-]) *hüq.* hüquqi / qanuni varis

**heirdom** ['eədəm] *n hüq.* irsən alma/alınma; varislik, varis olma; **to come into an** ~ varisliyi qəbul etmək

**heiress** ['eərıs] *n* varis, vərəsə *(qadın, qız)*

**heirless** ['eəlıs] *adj* bivaris, varisi olmayan

**heirloom** ['eəlu:m] *n* irsən/miras qalmış əşya, nəsildən-nəslə keçən əşya

**held** [held] **to hold** *felinin pt, pp formaları*

**heliac** [hi:'laıək] *adj astr.* = **heliacal**

**heliacal** [hi:'laıəkl] *adj astr.* 1. günəş, gün; 2. günəş doğmasından əvvəl və ya günəş batandan sonra doğan *(ulduz haq.)*

**helical** ['helıkl] *adj* vintşəkilli, spiralşəkilli

**helices** ['helısi:z] **helix** *isminin cəmi*

**Helicon** ['helıkn] *n* 1. *əs.* Helikon - qədim yunan əsatirlərində günəş allahı; 2. elm, incəsənət hamisi Apollonun yaşadığı dağ; 3. *məc.* ilham mənbəyi; yaradıcılıq; ilham; 4. helikon *(nəfəsli musiqi aləti)*

**helicopt** ['helıkɔpt] *v* = **helicopter**[2]

**helicopter**[1] ['helıkɔptəʳ] *n av.* vertolyot, helikopter; ~ **aerial ambulance** sanitar vertolyotu, təcili yardım vertolyotu

**helicopter**[2] ['helıkɔptəʳ] *v av.* 1. vertolyotda uçmaq; 2. vertolyotla daşımaq

**heliocentric** [ˌhi:lıou'sentrık] *adj* heliosentrik *(Günəşi ətrafında hərəkət edən planetlərin mərkəzi hesab edən nəzəriyyəyə məxsus)*

**heliograph** ['hi:lıougra:f] *n* 1. helioqraf *(günəşin şəklini çəkmək üçün fotoaparatı olan teleskop)*; 2. helioqravyura *(günəş işığının təsiri ilə metal plastinkalarda naxış alma üsulu)*

**heliogravure** [ˌhi:lıougrə'vjuəʳ] *n* = **heliograph**

**heliometer** [ˌhi:lı'ɔmıtəʳ] *n astr.* heliometr *(göy cisimlərinin görünən diametrlərini, göy cisimlərinin arasında olan kiçik bucaqları ölçmək üçün alət)*

**heliophilous** [ˌhi:lı'ɔfıləs] *adj bot.* işıqsevən, günəşsevən, kölgəsevməz *(bitki haq.)*

**heliophobic** [ˌhi:lıou'foubık] *adj bot.* günəşdən qorxan, kölgəsevən *(bitkilər)*

**heliophyte** ['hi:lıoufaıt] *n bot.* günəşsevən, işıqsevən bitki

**helioscope** ['hi:ljəskoup] *n* helioskop *(günəşi müşahidə etmək üçün optik cihaz)*

**helio-therapy** [ˌhi:lıou'θerəpı] *n* helioterapiya, günəş şüası ilə müalicə

**heliotrope** ['hi:ljətroup] *n* 1. *bot.* heliotrop *(gün çiçəyi)*; 2. heliotrop *(mineral adı)*; 3. = **heliograph** *(1-ci mənada)*

**helium** ['hi:ljəm] *n kim.* helium *(yüngül / yanmayan qaz, kimyəvi maddə)*

**helix** ['hi:lıks] *n* (*pl* **helices**) 1. *tex.* spiral, vintşəkilli xətt; 2. *mem.* volyuta *(qıvrımşəkilli bəzək)*; 3. qulaq seyvanının qıvrımı

**hell**[1] [hel] *n* 1. cəhənnəm; **to make** *smb.'s* **life a** ~ bir kəsin həyatını cəhənnəmə döndərmək; **to go/to suffer through** ~ cəhənnəm əzabı çəkmək; 2. qumarxana, tiryəkxana, oğru yuvası; 3. *amer.* istehsal tullantılarını yandırmaq üçün soba *(taxta-şalban zavodunda və s.)*;

◊ **a ~ of a...** son dərəcə pis, dəhşətli, dözülməz; **a ~ of a noise** dəhşətli səs-küy; **a ~ of a comedown** dözülməz uğursuzluq; **a ~ of a place** çox pis yer; **like ~** 1) güclü, son dərəcə, çox; *It is raining like hell Şırə-boran yağış yağır, Yağış elə yağır ki, tut ucundan çıx göyə; I'll miss you like hell Sənsiz / Sizsiz çox darıxacağam; He ran like hell O, güllə kimi yüyürdü*; 2) qətiyyən, əsla, heç vaxt; *What the hell do you want? Lənətə gələsən, axı sənə/sizə nə lazımdır?; Go to hell! Cəhənnəm ol!/olun!; Oh hell! Lənət sənə!; To hell with him! Qoy cəhənnəm olsun! Hell's bells!, Hell's fire!, Hell's wheels! Lənətə gələsən!, Lənət şeytana!*; **to work like ~** bərk / eşşək kimi işləmək; **to get / to catch ~** bərk məzəmmət/töhmət almaq/ qazanmaq; **to give** *smb.* ~ bir kəsə qulaqburması vermək; **to raise ~** dava-dalaş salmaq, qalmaqal qaldırmaq, hay-küy salmaq/qaldırmaq; **the ~ of** *smth.* bir şeyin məğzi / mahiyyəti, əsas mətləb; *The hell of the plan is that it works Əsas mətləb bundadır ki, bu plan realdır; The hell of it was that nobody could understand him Məsələ bunda idi ki, heç kəs onu başa düşə bilmirdi; She was hell for cleanliness O, təmizlik dəlisidir; All hell broke loose Dəhşətli səs-küy qopdu*; **come ~ or high water** nə olur olsun, nəyin bahasına olursa olsun; ~ **and / or high water** ağır sınaq; *He had his men through hell and high water O öz adamlarını oddan-alovdan, sudan keçirdi*

**hell**[2] [hel] *v* 1. gəzmək, kef çəkmək/eləmək; vaxtını əyyaşlıqda/kefdə keçirmək; *They came down to the city to hell around for a weekend Onlar şənbə və bazar günü gəzib kef çəkmək üçün şəhərə gəldilər*; 2. yüyürmək, bərk qaçmaq, götürülmək

**he'll** [hı:l] **he will** *sözünün qısa forması*

**hellbender** ['helˌbendəʳ] *n amer.* 1. kefcil, əhli-kef, əyyaş; 2. içki məclisi, keflilər qalmaqalı, şuluqluq, dava-dalaş

**hell-bent** ['hel'bent] *adj* (**on, for**) *amer. d.d.* 1. mübtəla *(bir şeyə)*; nəyin bahasına olursa olsun öz məqsədinə çatmağa can atan; 2. ağılsız, düşüncəsiz, ehtiyatsız; ~ **adventure** ağılsız avantüra



**hell-cat** ['helkæt] *n* küpəgirən/cadugər qarı, ifritə, bədqılıq *(qadın)*

**hellebore** ['helıbɔ:ʳ] *n bot.* asırqal, çöpləmə

**Hellene** ['heli:n] *n* ellin, yunan

**Hellenian** [he'li:njən] *adj* = **Hellenic**[2]

**Hellenic**[1] [he'li:nık] *n* 1. yunan dili; 2. *pl* yunan tarixi və mədəniyyəti məsələlərinə həsr olunmuş/edilmiş əsərlər

**Hellenic**[2] [he'li:nık] *adj* ellin, yunan

**Hellenism** ['helınızm] *n* ellinizm; qədim yunan mədəniyyəti

**Hellenist** ['helınıst] *n* 1. ellinist; 2. yunanca danışan *(yunan olmayanlar haq.)*

**heller** ['heləʳ] *n amer.* azğın / arsız adam

**hell-hag** ['helhæg] *n* = **hell-cat**

**hell-hound** ['helhaund] *n* 1. serber *(əs. cəhənnəm qapısını qoruyan sərt it)*; 2. şeytan, iblis; zalım, vəhşi, canavar, yırtıcı

**hellion** ['heljən] *n* dəcəl/nadinc/şuluqçu şeytan uşaq; nadinc / şuluqçu adam

**hello** ['he'lou, hə'lou] *int.* = **hullo**

**hello-girl** [he'louˌgə:l] *n d.d.* telefonçu qız

**helm**[1] [helm] *n* I 1. dəbilqə, dəmir papaq, şlem; 2. *arx.* üst, kəllə, təpə, baş; 3. = **helm-cloud**

**helm** [helm] *n* II 1. *dən.* sükan; **the man at the ~** sükançı; 2. sükan çarxı, şturval; 3. *məc.* rəhbər, idarə edən, başçı; **the ~ of state** dövləti idarə edən, başçı; hökumətə başçılıq edən; **to take the ~ of state** dövlətin başçısı olmaq, dövlətin idarəsini ələ almaq

**helm**[2] [helm] *v* I dəbilqə ilə/şlemlə örtmək

**helm** [helm] *v* II idarə/ başçılıq / rəhbərlik etmək

**helm-cloud** ['helmklaud] *n* dağın başını alan qara bulud

**helmet** ['helmıt] *n* 1. şlem *(muhafizə/təhlükəsizlik dəbilqəsi)*; **motorcyclist's** ~ motosikletçi şlemi/dəbilqəsi; **crash/safety** ~ qoruyucu şlem /dəbilqə; 2. *tex.* qapaq; buqel *(dəmir halqa / bənd)*

**helminth** ['helmınθ] *n* bağırsaq qurdu

**helmsman** ['helmzmən] *n dən.* sükançı, şturvalı idarə edən dənizçi

**helot** ['helət] *n* 1. ilot *(qədim Spartada təhkimli kəndli)*; 2. qul, kölə

**help**[1] [help] *n* 1. kömək, yardım; **to call out for ~** köməyə çağırmaq; *Thank you for your help Köməyinə/Köməyinizə görə sağ ol!/olun!*; **to be of no ~** faydasız/xeyirsiz olmaq; **to be of little ~** az faydası olmaq; **to lend effective ~ to** *smb.* bir kəsə aktiv yardım etmək/göstərmək; *Can I be of any help to you? Mən sənə / sizə bir şeylə kömək edə bilərəmmi?*; 2. köməkçi, yardımçı; *Your advice was a great help Sənin / sizin məsləhətinin / məsləhətinizin böyük köməyi / yardımı oldu*; 3. 1) işçi, fəhlə *(fermada)*; xidmətçi, qulluqçu, ev qulluqçusu; **lady ~** təsərrüfat müdiri; **mother's ~** bonna, tərbiyəçi qadın, mürəbbiyə; 2) *top.i* işçilər, ev qulluqçuları, xidmətçilər; 4. çarə, əlac, xilas; *There's no help for it Buna heç nə ilə kömək etmək olmaz*; **a situation for which there is no ~** çıxış yolu olmayan vəziyyət

**help**[2] [help] *v* I 1. kömək/yardım etmək/ göstərmək; *Will you help me (to) do this problem? Bu məsələni həll etməkdə mənə kömək edərsənmi?/edərsinizmi?; I can't lift this box alone, please help me Mən bu yeşiyi tək qaldıra bilmirəm, zəhmət olmasa, mənə kömək et / edin; I helped him (to) find his things Mən ona öz şeylərini tapmaqda kömək etdim; Please help me down with this heavy trunk Zəhmət olmasa, bu ağır çamadanı düşürməkdə mənə kömək et / edin*; **to ~** *smb.* **with** *one's* **advice** bir kəsə öz məsləhəti ilə yardım/kömək etmək; *Will you help me on with my overcoat, please? Lütfən kömək edərsənmi/edərsinizmi paltomu geyim; Tom has to help his mother who is too old to work Tom qoca anasına kömək etməli olur; Aspirin helps a headache Aspirin başağrısına kömək edir*; 2. səbəb/amil olmaq, imkan vermək /yaratmaq; *That helped his ruin Bu onun müflisləşməsinə səbəb oldu*; **to ~ towards the attainment of an end** məqsədə çatmağa imkan vermək/yaratmaq

**help** [help] *v* II 1. xidmət etmək, qulluğunda durmaq *(süfrə başında)*, yemək vermək; **to ~ to the soup** şorba vermək; *I want a spoon to help to gravy with Mənə sousu tökmək üçün qaşıq lazımdır*; 2. yüngülləşdirmək *(ağrını, aziyyəti və s.)*; **to ~ a cough** öskürməni yüngülləşdirmək / sağaltmaq; **remedies to ~ a cold** soyuqdəyməyə qarşı dərmanlar; **to ~** *smb.* **to** *smth.* bir kəsi bir şeyə qonaq etmək/ikram etmək; *I helped the boy to more meat Mən oğlana bir az da/yenə də ət qoydum /çəkdim; May I help you to some more wine? Sənə / Sizə yenə şərab süzümmü?*; **to ~ oneself to** *smth.* öz-özünə qulluq etmək; *He helped himself to brandy O özünə konyak süzdü; Help yourself!/ yourselves! Qonaq ol!/olun! Lütfən ye! /yeyin!*; 3. seçmək, götürmək, öz-özünə qulluq etmək; *May I take a book? - Help yourself Kitab götürmək olar? Buyurun, götürün, özün / özünüz seç /seçin; There are the goods, one must help oneself, as there is no salesman here Burada istədiyin məmulat/mal var, ancaq satıcı olmadığına görə gərək özün seçəsən*; **to ~** *smb.* **into** *smth.* bir kəsə bir yerə daxil olmaq/girmək üçün kömək etmək; *I helped her into the car Mən ona maşına minməyə kömək etdim*; **to ~** *smb.* **out of** *smth.* kiməsə bir yerdən çıxmağa kömək etmək; *He helped me out of the car O mənə maşından düşməyə kömək etdi*; 4. **cannot help** + *mürəkkəb tamamlıq*: özünü saxlaya bilməmək; **cannot ~ doing** *smth.* bir şeyi etməkdən özünü saxlaya bilməmək; *I could not help laughing Mən gülməkdən özümü saxlaya bilmədim; We cannot help believing them Biz onlara inanmaya bilmə-*

*rik; I cannot help thinking he's wrong Onun haqsız olması fikrini başımdan çıxara bilmirəm;* **cannot ~ but do** ***smth.*** bir şeyi etməmək iqtidarında olmamaq; *You couldn't help but tell him what happened Nə baş verdiyini ona söyləmək sadəcə mümkün deyildi;* **can ~** lazım olduğundan artıq; *Don't be longer than you can help Lazım olduğundan artıq qalma /qalmayın; Don't tell him more than you can help Lazım olduğundan artıq ona heç nə demə / deməyin;* **to ~ down** düşməyə kömək etmək; **to ~ in** içəri keçməyə/daxil olmağa kömək etmək; **to ~ on/forward** imkan yaratmaq, səbəb olmaq, yardım etmək, irəli çəkmək; *His advice helped us on very much Onun məsləhəti bizə çox kömək etdi; You can all do something to help on the work Siz hamınız işi irəli aparmaq üçün bir şey edə bilərsiniz;* **to ~ out** dadına çatmaq/yetmək, bəladan qurtarmaq; *You didn't say a word to help me out Sən/Siz məni bu çətin vəziyyətdən qurtarmaq üçün bir söz belə demədin/demədiniz;* **to ~ over** dadına çatmaq, qurtarmaq, kömək etmək; *He helped us over in our trouble O bu bəladan çıxmaqda bizə kömək etdi;*

◊ *So help me! Allah haqqı, Allaha and olsun! İstəyirsən inan, istəmirsən inanma;* **to ~ a lame dog over a stile** dar gündə bir kəsə əl uzatmaq; *God helps him who helps himself Özü özünə kömək edənə Allah da kömək edər,* ≅ *Səndən hərəkət, Allahdan bərəkət*

**helper** ['helpəʳ] *n* 1. köməkçi, yardımçı, müavin; yardımçı işlərə baxan fəhlə; 2. mehtər köməkçisi; 3. *d.y.* təkançı, itələyici *(qatarı daldan itələyən köməkçi parovoz)*

**helpful** ['helpful] *adj* faydalı, xeyirli

**helping** ['helpıŋ] *n* 1. porsiya, pay; **three ~s of meat and vegetables** üç porsiya ət və tərəvəz; 2. kömək/yardım etmə

**helpless** ['helplıs] *adj* 1. köməksiz, aciz; *I am helpless in the matter Bu məsələdə mən acizəm;* 2. kimsəsiz, arxasız; **an ~ orphan** kimsəsiz/arxasız yetim

**helplessly** ['helplıslı] *adv* aciz, acizanə, köməksiz, əlacsız bir tərzdə

**helpmate** ['helpmeıt] *n* köməkçi, yardımçı, həyat yoldaşı *(ər-arvad haq.)*

**helpmeet** ['helpmi:t] *n* = **helpmate**

**helter-skelter¹** ['heltə'skeltəʳ] *n* qarışıqlıq, hərcmərclik, qaçaqaç, hay-küy, mərəkə, vəlvələ

**helter-skelter²** ['heltə'skeltəʳ] *adj* nizamsız, qarmaqarışıq, dağınıq, səliqəsiz; **~ flight** nizamsız / pərakəndə qaçaqaç

**helve** [helv] *n* dəstək, sap *(baltanın və s.)*

**hem¹** [hem] *n* 1. sırıq, tikiş yeri *(parçada)*, 2. haşiyə, kənar

**hem²** [hem] *v* (**-mm-**) 1. qırağını basdırmaq; **to ~ a handkerchief** əl yaylığının qırağını basdırmaq; 2. haşiyələmək, haşiyə çəkmək; *All the skirt was hemmed with golden fringe Yubkanın ətəyi başdan-başa qızılı haşiyə ilə haşiyələnmişdi;* **to ~ about, to ~ in** dövrələmək, mühasirəyə almaq; **to be ~med about/around/by foes** düşmən tərəfindən mühasirəyə alınmaq; *The garden was hemmed in by houses Bağ evlərlə əhatə olunmuşdu*

**hem³** [hem, hm] *int.* hm! *(tərəddüd, istehza və diqqət yetirməni ifadə edir)*

**he-man** ['hı:'mæn] *n pl* ~ **men** [-men]) kişi adam, əsl kişi

**hematic** [hı'mætık] *adj* = **haematic**

**hematite** ['hemətaıt] *n* = **haematite**

**hemisphere** ['hemısfıəʳ] *n* 1. yarımkürə, yer kürəsinin yarısı; **Northern ~** Şimal yarımkürəsi; 2. *anat.* beyin yarımkürəciyi

**hemispheric** [.hemı'sferık] *adj* yarımkürəvi, yarımsferik; *amer.* **the ~ relations** qərb yarımkürəsi ölkələri arasındakı münasibətlər

**hemistich** ['hemıstık] *n ədəb.* yarımbənd, misra *(şerdə)*

**hemlock** ['hemlɔk] *n bot.* xallı baldırğan

**hemp** [hemp] *n bot.* 1. çətənə; 2. çətənə lifi; 3. həşiş *(narkotik maddə)*; 4. *jarq.* dar ağacı, kəndir

**hempen** ['hempən] *adj* çətənə lifindən hazırlanmış

**hem-stitch¹** ['hemstıtʃ] *n* bəzək tikişi; merejka *(şəbəkəli haşiyə)*; şəbəkəli zərif tikmə

**hem-stitch²** ['hemstıtʃ] *v* merejka/naxış tikmək; naxışlı tikmə tikmək

**hen** [hen] *n* 1. toyuq; **a clucking ~** qırt / kürt toyuq; **to keep ~s** toyuq saxlamaq; 2. bəzi quşların dişisi; 3. *zaraf.* arvad, qadın; 4. *mac.* qorxaq /ağciyər adam;

◊ **to sell *one's* ~s on a rainy day** öz malını namünasib vaxtda / əlimyandıda satmaq, iş bacarmamaq; *"Never mind our son" cried my wife, "...he knows what he is about, - I'll warrant, we'll never see him sell his hens on a rainy day..." "Oğlumuzla işin olmasın", deyə arvadım qışqırdı, "O nə etdiyini bilir, ...mən zəmanət verirəm ki, o heç vaxt öz malını əlimyandıda / əlverişsiz vaxtda satmaz"*

**henbane** ['henbeın] *n bot.* bəngotu

**hen-barrier** ['hen.bærıəʳ] *n zool.* belibağlı *(quş)*

**henbit** ['henbıt] *n bot.* ballıbaba, dalamaz

**hen-bussy** ['hen.bʌsı] *n d.d.* "qızbibi", "ağabacı" *(evdə arvad işlərilə məşğul olan kişi)*

**hence** [hens] *adv* 1. bu vaxtdan, bundan sonra, bu andan etibarən, bundan/bu vaxtdan belə, indidən; **a week ~** bundan bir həftə sonra; **three years ~** bundan üç il sonra; 2. bu səbəbdən, buna görə də, beləliklə, nəticə etibarilə; deməli, demək ki; *He has neither ear nor voice hence he cannot sing Onun nə musiqi duyumu, nə də səsi var, buna görə də o oxuya bilmir; Hence we infer Bu səbəbdən biz belə hesab edirik ki,...;* 3. *arx.* buradan; *Hence with him! Onu buradan rədd edin!; Hence it appears that... Buradan belə nəticəyə gəlmək olar ki,..*



**henceforth** ['hens'fɔ:θ] *adv* indidən, bu andan etibarən; gələcəkdə, bundan belə

**henceforward** ['hens'fɔ:wəd] *adv* = **henceforth**

**henchman** ['hentʃmən] *n (pl* **men** [-mən]) 1. tərəfdar, ardıcıl; 2. köməkçi, əlaltı, yaltaq, quyruqbulayan; 3. *tar.* paj silahdar *(cəngavərin silahını gəzdirən əsgər)*

**hencoop** ['henku:p] *n* toyuq hini

**hendecagon** [hen'dekəgən] *n riyaz.* onbirbucaq

**hendriver** ['hen.draıvəʳ] *n* = **hen barrier**

**hen-flesh** ['henfleʃ] *n* qovuqlu dəri *(qaz dərisi kimi)*; biz-biz dəri *(soyuqdan, əsəbdən)*

**hen-hearted** ['hen'ha:tıd] *adj* quşürək, qorxaq, ağciyər, ürəksiz, cəsarətsiz

**hen-house** ['henhaus] *n* toyuq hini / damı

**henna¹** ['henə] *n* 1. *bot.* xınaotu; 2. xına *(boya)*

**henna²** ['henə] *adj* xına rəngi, qırmızımtıl-qəhvəyi, xınaya çalar

**henna³** ['henə] *v* xına yaxmaq/ qoymaq; **to ~ *one's* hair** saçına xına yaxmaq/qoymaq

**henna-dyed** ['henə'daıd] *adj* xına qoyulmuş, xına ilə / qırmızımtıl-qəhvəyi rənglənmiş; **~ hair** xına qoyulmuş / xına ilə rənglənmiş saç

**hennaed** ['henəd] *adj* = **henna-dyed**

**hennery** ['henərı] *n* quşçuluq ferması

**hen-party** ['hen.pa:tı] *n* 1. *zaraf.* arvad yığıncağı, "arvad/zənənə hamamı"; 2. *amer. d.d.* qız-gəlin məclisi *(kişilər iştirak etməyən şənlik)*

**hen-pecked** ['henpekt] *adj d.d.* arvadının tam itaətində olan, arvadağız

**hen-roost** ['henru:st] *n* tar *(hində toyuqlar və ya qəfəsdə quşlar yatmaq üçün qoyulan ağac)*

**hen-wife** ['henwaıf] *n (pl* **~wives** [-waıvz]) quşçu / quşa baxan qadın/qız

**hep¹** [hep] *n* = **hip**

**hep²** [hep] *adj* məlumatlı, hər şeyi bilən, hər şeydən başı çıxan; *By running with older boys I soon began to get hep Özümdən böyük uşaqlarla dolandığımdan az bir zamanda mən onlardan hər şeyi öyrəndim; He is a pretty hep boy O çox arif / zirək oğlandır, Ona kələk gəlmək olmaz, Onu aldatmaq olmaz*

**hepatic** [hı'pætık] *adj* 1. *tib.* qara ciyər, qara ciyərə aid; **~ duct** qara ciyər axarı; **~ disease** qara ciyər xəstəliyi; 2. qara ciyərə təsir edən; 3. qırmızımtıl-qəhvəyi

**hepatitis** [hepə'taıtıs] *n tib.* hepatit, qara ciyərin iltihabı

**hepatolith** ['hepətəlıθ] *n tib.* hepatolit, öd kisəsində / qara ciyərdə daş

**heptagon** ['heptəgən] *n riyaz.* yeddibucaq

**heptagonal** [hep'tægənl] *adj riyaz.* səkkizbucaqlı

**her** [hə:ʳ] *tam forması;* [ə:, hə, ə] *zəif formaları;* I. 1. **she** *(III şəxs təkdə qadın cinsi üçün) şəxs əvəzliyinin obyekt halı*: onu, ona; 2. *d.d.* o; *Just see if that isn't her Bax, gör o deyilmi; That's her! Odur! Bu da o!; The boy is older than her Oğlan ondan böyükdür;* 3. öz; *She closed the door behind her O özündən sonra qapını bağladı; She took the parcel away with her O, bağlamanı / paketi özü ilə apardı*

**her** [hə:ʳ] *tam forması;* [ə:, hə, ə] *zəif formaları;* II *poss. pron.*: onun, özünün; *Her parents live with her Onun valideynləri onunla yaşayırlar; Her eyes are blue Onun gözləri mavidir; Her own sons have said that Bunu onun öz oğulları deyiblər; That is her hat, not yours Bu onun şlyapasıdır, səninki/sizinki yox;* 2. *Bəzi hallarda Azərbaycan türkcəsinə tərcümə edilmir. Bu halda* **her** *əvəzliyinin mənası nisbət şəkilçiləri (-ı, -i, -u, -ü) ilə ifadə edilir: She closed her eyes O, gözlərini yumdu; She rubbed her hands O, əllərini ovuşdurdu*

**herald¹** ['herəld] *n* 1. *tar.* carçı; *Silence is the perfectest herald of joy (Shakespeare) Sükut sevincin ən gözəl carçısıdır;* 2. müjdəçi, xəbərgətirən; **a ~ of spring** baharın müjdəçisi; *In England cuckoo is a herald of spring İngiltərədə ququ quşu bahar müjdəçisidir*

**herald²** ['herəld] *v* 1. xəbər/məlumat vermək, bildirmək, elan etmək; 2. qabaqcadan xəbər vermək, müjdə gətirmək; *The song of birds heralds the approach of spring Quşların nəğməsi baharın gəlişindən xəbər verir*

**heraldry** ['herəldrı] *n* heraldika *(gerblər və onların tarixinin təsviri)*

**herb** [hə:b] *n* 1. ot, bitki *(xüs. dərman otları/bitkiləri)*; **to gather ~s** dərman otları toplamaq/yığmaq; 2. *pl* göyərti, səbzəvat; ədviyyat, ədviyyə bitkiləri;

◊ *No herb will cure love Eşqin dərmanı olmaz, Eşqin əlacı yoxdur*

**herbaceous** [hə:'beıʃəs] *adj* otlu, ot, sıx otlu /ot bitmiş; **~ border** çiçək bordürü

**herbage** ['hə:bıdʒ] *n* 1. *top.i* otlar, ot örtüyü; **scanty ~** seyrək / zəif ot örtüyü; pis otlaq; 2. *hüq.* otlaq hüququ

**herbal** ['hə:bəl] *adj* ot, ota məxsus; **~ medicine** otdan/ot bitkisindən düzəldilmiş dərman; **~ tea** ot çayı

**herbalist** ['hə:bəlıst] *n* 1. ot xiridarı, otları yaxşı tanıyan; dərman otları toplayan/yığan; 2. dərman otları satan adam; 3. nəbatatçı, botanik

**herbalize** ['hə:bəlaız] *v arx.* dərman bitkiləri toplamaq / yığmaq

**herbaria** [hə:'beərıə] *n* **herbarium** *isminin cəm forması*

**herbarium** [hə:'beərıəm] *n (pl* **-riums** *və ya.* **-ria**) *bot.* herbari *(qurudulmuş bitkilərin kolleksiyası)*

**herbicide** ['hə:bısaıd] *n k.t.* herbsid *(alaq otlarını məhv etmək üçün kimyəvi maddə)*

**herbivorous** [hə:'bıvərəs] *adj zool.* otyeyən *(heyvanlar)*

**herborize** [ˈhə:bəraız] *v* 1. öyrənmək məqsədilə bitki toplamaq; 2. bitki toplamaqla məşğul olmaq

**Herculean** [ˌhəkju:ˈli:ən] *adj* 1. herkules; ~ **labours** herkules rəşadəti /qəhrəmanlığı; 2. son dərəcə böyük, çox böyük, nəhəng, azman, əzəmətli, çox güclü/qüvvətli; **a man of ~ build** azman / nəhəng qədd-qamətli/cüssəli adam; 3. çox çətin, qorxulu, təhlükəli; ~ **talks** ölçüyəgəlməz dərəcədə çətin danışıqlar

**Hercules** [ˈhə:kjuli:z] *n əs.* 1. Herkules; 2. pəhləvan, çox güclü adam; 3. *astr.* Herkules *(bürc adı)*; ◊ **Pillars/Straits of ~** 1) Cəbəllütariq, Herkules sütunları; 2) sərhəd, hədd, hədd-hüdud; **Hercules' club** Herkules zopası

**herd**[1] [hə:d] *n* 1. naxır, sürü; **a ~ of cattle** inək naxırı; **a ~ of deer** maral sürüsü; 2. *məc.* dəstə, yığın; **a ~ of parasites** avaralar dəstəsi/yığını; ◊ **to break ~** sürüdən / naxırdan ayrı düşmək

**herd**[2] [hə:d] *v* 1. sürmək, örüşə aparmaq; *The farmer herded the cows into the field Kəndli inəkləri örüşə/çölə sürdü;* 2. **(with)** bir kəslə bir yerdə olmaq/gəzmək; qoşulmaq, birləşmək; **to ~ with** *smb.* bir kəslə birləşmək; 3. sürünü/naxırı bir yerə toplamaq; **to ~ cattle** naxırı bir yerə toplamaq; **to ~ together like cattle** mal kimi bir yerə toplanmaq; 4. otarmaq

**herd-boy** [ˈhə:dbɔı] *n* 1. bala çoban, çoban şagirdi / köməkçisi; 2. *amer.* kovboy

**herdsman** [ˈhə:dzmən] *n pl* **-men** [-men]) çoban, naxırçı

**here** [hıə^r] *adv* 1. burada, burda; *He lives here O burada/burda yaşayır;* 2. bu anda; *Here he stopped reading and looked up Bu anda o oxumağa fasilə verib başını qaldırdı;* 3. buraya, bura; *Put the box here Qutunu bura qoy/qoyun; Come here! Bura gəl!/gəlin!; Bring it here! Onu bura gətir!/gətirin!* 4. budur, bu da, bax budur/ odur, bax bu, buyurun bu da; *Here is your bag! Budur sənin/sizin çantan!/çantanız!; Here comes the bus! Budur avtobus gəlir; Here are the others Bax bu da başqaları; Here we are! Bu da biz!; Here you are! Buyurun! Buyurun bu da sən/siz istəyən/ istədiyiniz; Here! Buyur/Buyurun!* 5. nida kimi işləndikdə: *Ey! Bura bax! Here someone! Landlady! Where are you? Ey kim var? Ay ev sahibi! Haradasınız?;* ◊ **~ and there** 1) gah burda, gah orda; hər yerdə/yanda/tərəfdə; 2) bir müddətdən sonra, bəzən; 3) oralara; ~, **there and everywhere** hər yerdə/tərəfdə/yanda; ~ **below** bu dünyada; *Here goes! Başladıq! Getdik!; Look! amer. See here! Bura bax! Eşit! Qulaq as!; Same here Mən də, mən də həmçinin; Here's to you!, Here's luck!, Here's how! Şərəfinə!/Şərəfinizə!, Sənin/Sizin sağlığına!/sağlığınıza!; Here's a go! Öz sağlığımıza!; Here to-day and gone tomorrow "Köçəri quş", bu gün burda sabah orda; Here, here! Mən razı, Mən də!*

**hereabout(s)** [ˈhıərəˈbaut(s)] *adv* yaxında, yaxınlıqda, çox yaxın, lap yaxında, qonşuluqda

**hereafter** [ˈhıərˈa:ftə^r] *adv* 1. bunun ardınca, sonra, ona görə də, ondan ötrü; aşağı, aşağıda *(bu məqalədə, kitabda və s.)*; 2. gələcəkdə, bundan sonra

**hereat** [hıərˈæt] *adv arx.* əlavə olaraq..., bununla bərabər, bununla

**hereby** [ˈhıəˈbaı] *adv* 1. *hüq.* bununla, bununla bərabər; 2. beləliklə; 3. *arx.* yaxınlıqda

**hereditary** [hıˈredıtərı] *adj* 1. irsi/nəsildən-nəslə keçən, irsən alınmış / keçmiş; ~ **instinct** anadangəlmə/irsi keçən instinkt; ~ **disease** irsi xəstəlik; ~ **jewels** irsən alınmış/keçmiş daş-qaş; 2. ənənəvi, ənənəyə əsaslanan; ~ **customs and beliefs** ənənəvi adətlər və inanclar; ~ **feud** atababa düşmənçiliyi

**heredity** [hıˈredıtı] *n* 1. irsiyyət; 2. *hüq.* irsi xüsusiyyət / əlamət / xassə

**herein** [ˈhıərˈın] *adv* bununla, bununla bərabər

**hereinafter** [ˈhıərınˈa:ftə^r] *adv* gələcəkdə, bundan sonra, aşağıda

**hereof** [hıərˈɔv] *adv* bu xüsusda / barədə, haqqında, barəsində

**hereon** [hıərˈɔn] *adv* 1. bu barədə/haqda; 2. bu əsasda

**heresy** [ˈherəsı] *n* 1. bidət, küfr; **to fall into ~** küfr danışmaq, bidət etmək

**heretic** [ˈherətık] *n* dönük, kafir

**heretical** [hıˈretıkəl] *adj* dönük, dinsiz, imansız, allahsız; ~ **opinions** dinsiz baxışlar/fikirlər

**hereto** [ˌhıəˈtu:] *adv dəft.* 1. əlavə olaraq; 2. birdə ki, üstəlik, həm də

**heretofore**[1] [ˈhıətuˈfɔ:^r] *adj* əvvəlki, sabiq, keçmiş, qabaqkı

**heretofore**[2] [ˈhıətuˈfɔ:^r] *adv* əvvəllər, keçmişdə, bu vaxta qədər

**hereupon** [ˈhıərəˈpɔn] *adv* 1. bunun ardınca, bundan sonra; 2. bu xüsusda, haqqında

**herewith** [ˈhıəˈwıð] *adv* 1. bununla, bununla bərabər; 2. bunun vasitəsilə

**heritable** [ˈherıtəbl] *adj* irsi, irsən alınmış

**heritage** [ˈherıtıdʒ] *n* miras, irs; *War had left its heritage of poverty Yoxsulluq müharibədən miras qalmışdı*

**heritor** [ˈherıtə^r] *n* varis, vərəsə, vəliəhd

**hermaphrodite**[1] [hə:ˈmæfrədaıt] *n* hermafrodit, xonsa, ikicinsli xilqət; *d.d.* oğlan-qız

**hermaphrodite**[2] [hə:ˈmæfrədaıt] *adj* 1. *biol.* ikicinsli; ~ **flower** ikicinsli çiçək; 2. *məc.* iki xassəni/əlaməti birləşdirən

**hermetic** [ˈhə:metık] *adj* kip, germetik, sukeçirməz, havakeçirməz; ~ **seal/sealing** germetik lehimləmə, lehimlənmə

**hermetically** [ˈhə:metıkəlı] *adv* kip, germetik

**hermit** [ˈhə:mıt] *n* münzəvi, zahid, tərkidünya

**hermitage** [ˈhə:mıtıdʒ] *n* zahid sığınacağı, tənha ev / məskən



**hermit-crow** [ˈhə:mıtˈkrou] *n zool.* qarğa *(qırmızıdimdik)*

**hern** [hə:n] *n* = **heron**

**hernia** [ˈhə:njə] *n (pl* **-niae, -nias** [-z]) *tib.* qrija, yırtıq, dəlik

**hero** [ˈhıərou] *n (pl* **-oes** [-ouz]) 1. qəhrəman; **national ~** milli qəhrəman; **a ~ of the quill** dahi yazıçı; **to become/to be a ~ in** *smb.'s* **eyes** bir kəsin gözündə qəhrəman olmaq; 2. əsas iştirak edən şəxs/personaj, qəhrəman *(bədii əsərlərdə, filmlərdə və s.)*; **the ~ of the story/of an adventure** hekayənin/macəranın qəhrəmanı; **to admire a ~** qəhrəmana heyran/valeh / məftun olmaq *(əsərin qəhrəmanına və s.)*; 3. yarımallah *(antik ədəbiyyatda)*

**heroic** [hıˈrouık] *adj* 1. qəhrəman, igid, cəsur, cəsarətli, şücaətli; ~ **attempt** cəsarətli cəhd; ~ **deed** cəsarətli hərəkət; 2. *ədəb.* qəhrəmanlıq, epik; ~ **poem** qəhrəmanlıq poeması, epik poema; 3. *tib.* riskli, cəsarətli, təhlükəli *(müalicə üsulu haq.)*; ~ **medicine** riskli dərman; ~ **treatment** riskli müalicə; ~ **dose** təhlükəli doza

**heroin** [ˈherouın] *n* heroin *(narkotik maddə)*

**heroine** [ˈherouın] *n* qəhrəman qadın; əsərin əsas qəhrəmanı/surəti

**heroism** [ˈherouızm] *n* qəhrəmanlıq, igidlik, qoçaqlıq, şücaət; **acts of ~** qəhrəmanlıq hərəkətləri / əməlləri

**heron** [herən] *n zool.* vağ *(quş)*

**heronry** [ˈherənrı] *n* vağ yuvası, vağın yuva yeri

**hero-worship** [ˈhıərouˌwə:ʃıp] *n* 1. qəhrəmanlar qarşısında səcdə etmə; 2. pərəstiş etmə, pərəstiş; məftunluq

**herpes** [ˈhə:pi:z] *n tib.* dəmrov, herpes

**herring** [ˈherıŋ] *n zool.* siyənək *(balıq növü)*; **salted ~** duzlanmış siyənək balığı; **kippered ~** hisə verilmiş siyənək balığı; ◊ **packed as close as ~** ağzınacan dolu; **to draw a red ~ across the path / track / trail** fikrini yayındırmaq; qəsdən/bilərəkdən yanıltmaq, çaşdırmaq, azdırmaq

**herring-bone** [ˈherıŋboun] *n* 1. siyənək balığının skeleti; 2. cinahı naxış, cinahşəkilli naxış; 3. kərpici yolka şəklində hörmə; kərpiclə cinahı naxış vurma *(hörgüdə)*

**hers** [hə:z] *poss. pron.* **(her** *yiyəlik əvəzliyinin müstəqil işlənən forması)* 1. onun, onunku; *This book is hers Bu kitab onunkudur; It is a friend of hers Bu onun dostlarından biridir; It is no business of hers Bu onun işi deyil;* 2. onun, özünün, özününkü; *This is my pen, hers is on the table Bu mənim qələmimdir, onunku stolun üstündədir*

**herself** [həˈself] *pron.* 1. *refl. pron. (qadın cinsi III şəxs təkdə)* öz, özü..*(-nə, -ndən, özü üçün)*; *She ought to be ashamed of herself O gərək özü-özündən utansın; She has to attend to herself O özü-özünə qulluq etməlidir; She came to herself O özünə gəldi; She has the habit of talking to herself Onun özü-özünə danışmaq adəti/şakəri var;* 2. özü, özünü; *She told me the news herself O özü bu xəbəri mənə söylədi; I heard it from a girl who herself was present Mən bunu özü orada olmuş qızdan eşitdim; I saw Mrs Smith herself Mən xanım Smitin özünü gördüm;* 3.: **(all) by ~** özü, tək, təkcə, müstəqil, heç kəsin köməyi olmadan; *Can she do it (all) by herself O özü təkcə bunu edə bilərmi?; She was all by herself O tamamilə tək idi;* ◊ *She is not herself to-day Bu gün o, özündə deyil; She looks herself again O, özünə gəlib; She knows how to keep herself to herself O, başqalarının işinə qarışmır, O, özünü araya soxmur*

**hertz** [hə:ts] *n fiz.* hers *(rəqs tezliyinin ölçü vahidi)*

**Hertzian wave** [ˈhə:tsıənˈweıv] *n fiz.* elektromaqnit dalğası

**he's** [hi:z] **he is** *və* **he has**-*in qısa forması*

**hesitance** [ˈhezıtəns] *n* = **hesitancy**

**hesitancy** [ˈhezıtənsı] *n* tərəddüd, şübhə, şəkk, qətiyyətsizlik, mütərəddidlik

**hesitant** [ˈhezıtənt] *adj* mütərəddid, qətiyyətsiz, tərəddüd edən, qərarsız

**hesitantly** [ˈhezıtəntlı] *adv* = **hesitantly**

**hesitate** [ˈhezıteıt] *v* 1. tərəddüd/şübhə etmək, şübhələnmək; *I hesitated about taking the position Bu vəzifəni tutmağa tərəddüd etdim; We hesitated concerning the course to be taken Biz yol seçməkdə tərəddüd etdik; He is still hesitating about joining the expedition O hələ də ekspedisiyaya qoşulmağa tərəddüd edir; Go on! Don't hesitate! Davam et!/edin! Tərəddüd etmə!/etməyin!;* 2. utanmaq, çəkinmək, cürət etməmək, ehtiyat etmək; *I hesitate to affirm Təsdiq etməyə ehtiyat edirəm;* **to ~ about accepting a gift** hədiyyə qəbul etməyə utanmaq/çəkinmək; *I choose rather to hesitate my opinion Mən müəyyən bir fikir söyləməkdən çəkinirəm / ehtiyat edirəm; Do not hesitate to ask me! Çəkinmə/Çəkinməyin, məndən soruş!/soruşun!, Məndən soruşmağa utanma!/utanmayın!* 3. duruxa-duruxa danışmaq, duruxmaq; **to ~ in one's speech** duruxa-duruxa danışmaq

**hesitatingly** [ˈhezıteıtıŋlı] *adv* 1. tərəddüdlə, qəti olmayaraq, mütərəddid bir surətdə; 2. duruxa-duruxa

**hesitation** [ˌhezıˈteıʃn] *n* 1. tərəddüd, şəkk; *She agreed without the slightest hesitation O əsla tərəddüd etmədən razılaşdı; There's no room for hesitation Tərəddüdə heç bir yer yoxdur;* 2. qətiyyətsizlik, mütərəddidlik; *His doubts and hesitations were tiresome Onun şübhələri və qətiyyətsizliyi usandırıcı / dözülməz idi*

**hesitative** [ˈhezıteıtıv] *adj* tərəddüd edən, mütərəddid, qətiyyətsiz; **his ~ manner of speaking** onun qətiyyətsiz danışıq tərzi

**Hesperus** [ˈhespərəs] *n astr.* axşam / zöhrə ulduzu, Venera

**heterodox** ['hetərədɔks] *adj* dönük, kafir, ortodoks olmayan; **a ~ person** dönük kafir adam /şəxs
**heterodoxy** ['hetərədɔksı] *n* **1.** bidət, küfr, qeyri-ortodoksluq, ortodoks olmama; **2.** qeyri-ortodoksal doktrina
**heterogeneity** [.hetəroudʒı'ni:ıtı] *n* geterogenlik, müxtəlif cinslilik / tərkiblilik
**heterogeneous** [.hetərou'dʒi:njəs] *adj* geterogen, müxtəlif cinsli; müxtəlif; **the ~ population of the US** ABŞ-ın müxtəlif irqli əhalisi
**hew** [hju:] *v* (*pt* **hewed,** *pp* **hewn, hewed**) **1.** kəsmək; çapmaq; doğramaq; yarmaq *(balta ilə)*; **to ~ trees** ağacları kəsmək; *He hewed his enemy to pieces O, düşmənini qılıncla doğradı, O, düşmənini tikə-tikə doğradı*; **2.** ağacları qırıb özünə yol açmaq; yarıb keçmək; *He hewed his way through dense jungle O, sıx cəngəllikdən özünə yol açdı, O, sıx cəngəlliyi yarıb keçdi*; **3.** yonmaq, yonub düzəltmək/hamarlamaq, təraş etmək; **to ~ timber** tiri yonmaq; **to ~ stone into a beautiful statue** daşı yonub gözəl bir heykəl düzəltmək; **to ~ away** kəsib üzmək, çapıb atmaq; **to ~ down** kəsib salmaq, qırmaq, doğramaq; **to ~ off / away / out 1)** qırıb qurtarmaq; **2)** oymaq, qazımaq, həkk etmək, taraşlamaq
**hewer** ['hju:ə<sup></sup>] *n* **1.** odunçu, ağacqıran; **2.** daşyonan; təraş ustası, təraşçı; **3.** qazmaçı; **4.** günəmuzdçu, günəmuzd/ qara fəhlə; **~s of wood and drawers of water** gərgin / ağır fiziki işlə məşğul olanlar
**hexa** ['heksə] *mürəkkəb sözlərin altı mənasında olan birinci komponenti: Azərbaycan türkcəsində* **hekza, heksa** *və ya* **altı** *sözlərilə ifadə olunur:* **hexagon altı**bucaq
**hexagon** ['heksəgən] *n riyaz.* altıbucaq *(həndəsi cisim)*
**hexagonal** [hek'sægənəl] *adj* altıbucaqlı
**hexahedron** [.heksə'hi:drən] *n riyaz.* heksader, altıüzlü; **regular ~** kub
**hexameter** [hek'sæmıtə<sup></sup>] *n* hekzametr *(qədim yunanlarda şer vəzni)*
**hey** [heı] *int.* **1.** Hey!; Ey! *(çağırış)*; **2.** Bəh-bəh!; Hey-hey! *(sevinc bildirir)*; **3.** Yox-a!; Bıy! *(təəccüb bildirir)*; *Hey for Smith! Smitə eşq olsun!, Yaşasın Smit!*
**hey-day**[1] ['heıdeı] *n* zirvə, ən yüksək nöqtə; çiçəklənmə; çox gözəl əyyam, gözəl çağ; **in the ~ of youth** gəncliyin gözəl çağında; gəncliyin çiçəklənmə dövründə; **in the ~ of** ***one's*** **glory** şöhrətin zirvəsində; *The 20th century is the heyday of the cosmonautics İyirminci əsr kosmonavtikanın sürətlə inkişaf/çiçəklənmə dövrüdür*
**hey-day**[2] ['heıdeı] *int.* = **hey** *(2-ci mənada)*
**hi** [haı] *inter.*= **1. hey**; **2.** *amer. Salam!; Allo!; Hi, Jane! Salam / Xoş gördük Ceyn!*
**hiatus** [haı'eıtəs] *n* (*pl* **-ses** [-zız]) **1.** boşluq, buraxılmış/boş buraxılmış yer *(yazıda)*; **a ~ in a manuscript** əlyazmada boş buraxılmış yer; **2.** *dilç.* hiatus *(saitlərin qulağa xoş gəlməyən birləşməsi)*, qovuşma
**hibernal** [haı'bə:nl] *adj* qış, qışa məxsus
**hibernate** ['haıbə:neıt] *v* **1.** qış yuxusuna getmək *(heyvanlar haq.)*; **2.** *məc.* qış yuxusuna getmək, hərəkətsiz/boş dayanmaq, fəaliyyət göstərməmək; **3.** qışlamaq; qışı isti ölkələrdə keçirmək, isti ölkələrdə qışlamaq
**hibernation** [.haıbə:'neıʃn] *n* **1.** qış yuxusu; **in the state of ~** qış yuxusunda olma; **2.** qışlama; **3.** *məc.* fəaliyyətsizlik, hərəkətsizlik
**hiccough** ['hıkʌp] *n* = **hiccup**[1,2]
**hiccup**[1] ['hıkʌp] *n* hıçqırıq, hıçqırma; **to have the ~s** hıçqırmaq
**hiccup**[2] ['hıkʌp] *v* hıçqırmaq; **to ~ out** hıçqıra-hıçqıra danışmaq
**hick**[1] [hık] *n amer.* kəndli, əyalət adamı, kəntli-kütlü, avam
**hick**[2] [hık] *v* **1.** hıqqınmaq; hıqqına-hıqqına danışmaq; **2.** hıçqırmaq
**hickory** ['hıkərı] *n bot.* **1.** pekan *(yağlı qidalı meyvəsi olan ağac)*; **2.** pekan meyvəsi; **3.** pekan oduncağı / ağacı *(emal üçün)*; **4.** pekan ağacından hazırlanmış məmulat
**hid** [hıd] **hide** *felinin pt və pp formaları*
**hidalgo** [hı'dælgou] *n tar.* hidalqo *(ispan zadəganı)*
**hidden**[1] ['hıdn] *adj* gizlədilmiş, gizlin; məxfi, gizli; **~ treasure** gizlədilmiş xəzinə; **~ thoughts** gizli düşüncələr; **~ meaning** gizli məna
**hidden**[2] ['hıdn] **hide** *felinin pp forması*
**hide**[1] [haıd] *n* I dəri, gön; **raw ~** təzə / təzə soyulmuş dəri/gön; **to have a thick ~** qalın dərili / dərisi qalın olmaq; *məc.* gönüqalın *(adam)*;
◊ **in ~ and hair** tamamilə, bütünlükdə; *Neither hide nor hair Nə izi var, nə tozu*; bir dəfə də olsa, heç vaxt; **to save** ***one's*** **~** öz canını qurtarmaq; **to tan/to dress** ***smb.'s*** **~** *məc.* bir kəsin gönünü almaq/ dərisini boğazından çıxarmaq, bir kəsi döymək/əzişdirmək
**hide** [haıd] *n* II pusqu, marıq, bərə *(ovda)*
**hide**[2] [haıd] *v* I **1.** dərisini soymaq; içalatını çıxarmaq *(kəsilən heyvanın, balığın və s.)*; **2.** *məc.* *d.d.* çubuqlamaq, döymək, gönünü / canını almaq
**hide** [haıd] *v* II (*pt* **hid**; *pp* **hidden, hid**) **1.** gizlətmək; **to ~ (away) a treasure** xəzinə gizlətmək; *Quick, hide yourself! Tez ol/ olun, gizlən!/gizlənin!; The future is hidden from us Gələcəyi bilmək olmaz, Gələcək bizə məlum deyil; She hid her face in her hands O, üzünü əllərilə gizlətdi*; **2.** gizlənmək, yox olmaq *(həm də* **to ~ up**); *Where is he hiding now? İndi o harada gizlənir?; You had better hide Yaxşı olar ki, sən/siz gizlənəsən/gizlənəsiniz*; **3.** büruzə verməmək, göstərməmək, gizlətmək *(hissini və s.)*; *She tried to hide her feelings O, hisslərini gizlətməyə çalışdı; I have nothing to hide Mənim gizlədəsi heç nəyim yoxdur; What are you hiding from me? Sən/Siz məndən nəyi gizlədirsən? / gizlədirsiniz?*; **4.** örtmək, tutmaq, gizlətmək; *The sun was hidden by the clouds Buludlar günəşin üzünü örtdü; The wall is hidden under the ivy Sarmaşıq bütün divarı tutub / örtüb;*
◊ **to ~** ***one's*** **face 1)** üzünü çevirmək / döndərmək/gizlətmək; **to ~** ***one's*** **head 1)** gizlənmək; **2)** gözdən itmək, gözə görünməmək *(xəcalətdən)*; **to ~** ***one's*** **light** ***/one's*** **candle under a bushel** öz ağıl və istedadını gizlətmək; həddindən artıq təvazökar olmaq



**hide-and-seek** ['haıdn'si:k] *n* gizlənpaç *(uşaq oyunu)*; **to play ~** gizlənpaç oynamaq
**hidebound** [haıdbaund] *adj* **1.** çox arıqlamış, əldən düşmüş, üzülmüş *(heyvanat haq.)*; **2.** yorulmuş, gücdən düşmüş *(torpaq)*; **3.** dardüşüncəli, məhdud dünyagörüşlü
**hideous** ['hıdıəs] *adj* iyrənc, mənfur, çirkin, çox pis; dəhşətli, qorxunc, müdhiş; **a ~ face** iyrənc sifət; **~ crime** dəhşətli cinayət; **~ noise** dəhşətli səs-küy; **~ uproar** qorxunc gurultu, çox bərk hay-küy; **~ building** eybəcər / yöndəmsiz bina
**hideously** ['hıdıəslı] *adv* çox, çox pis, son dərəcə, olduqca, həddən artıq
**hide-out** ['haıd'aut] *n d.d.* sığınacaq, daldalanacaq *(yer)*, pənahgah; sığınaq
**hiding** ['haıdıŋ] *n* I **1.** gizlətmə; gizlənmə; **to be in ~** gizlənmək; **2.** = **hiding-place**
**hiding** ['haıdıŋ] *n* II döymə; döyülmə *(çubuqla)*; **to give** ***smb.*** **a good ~** bir kəsə yaxşıca qulaqburması vermək, bir kəsi çubuqla döymək
**hiding-place** ['haıdıŋpleıs] *n* **1.** gizli yer, xəlvətxana, məxfi yer; **2.** məxfi sığınacaq
**hierarchy** ['haıəra:kı] *n* **1.** iyerarxiya; **the ~ of the civil service** hakimiyyət iyerarxiyası, "vəzifə pillələri"; **2.** kilsə hakimiyyəti, teokratiya *(siyasi hakimiyyətin ruhanilərin əlində olan idarə üsulu)*
**hieratic** [.haıə'rætık] *adj* iyeratik, kahin; **~ writing** iyeratik yazı *(heroqlif yazısı əsasında düzəldilmiş sadə yazı)*
**hieroglyph** ['haıərəglıf] *n* **1.** heroqlif; **2.** gizli işarə; **3** *məc.* "ilan-qurbağa" *(oxunmaz yazı)*; *I can't read his hieroglyph Mən onun "ilan-qurbağa"sını oxuya bilmirəm*
**hieroglyphic** [.haıərə'glıfık] *adj* **1.** heroqlif; heroqliflə yazılmış; **2.** gizli mənası olan; **3.** qarmaqarışıq, anlaşılmaz, "ilan-qurbağa"
**hi-fi**[1] [.haı'faı] *n* **(high fidelity**-*birləşməsinin qısa forması)* yüksək keyfiyyətli, əla / dəqiq cihaz
**hi-fi**[2] [.haı'faı] *adj* yüksək keyfiyyətli, əla; dəqiq; **a ~ set** dəqiq/yüksək keyfiyyətli cihaz *(maqnitofon, radio, televizor və s. haq.)*
**higgle** ['hıgl] *v* **1.** qiymətləşmək, qiymət danışmaq, qiymət danışıb ucuz almaq; **2.** səyyar mal / malı gəzdirərək satmaq
**higgledy-piggledy**[1] ['hıgldı'pıgldı] *n* tam səliqəsizlik, tör-töküntü
**higgledy-piggledy**[2] ['hıgldı'pıgldı] *adj* nizamsız, qarmaqarışıq, səliqəsiz
**higgledy-piggledy**[3] ['hıgldı'pıgldı] *adv* pərakəndə, qarmaqarışıq, necə gəldi; **things thrown down ~ on the floor** döşəmənin üstünə necə gəldi atılmış əşyalar
**higgler** ['hıglə<sup></sup>] *n* çərçi, səyyar satıcı, ayaqçı
**high**[1] [haı] *n* **1.** ən yüksək nöqtə; maksimum; **to be in the ~** ən yüksək səviyyədə /son həddə olmaq; **2.** pik *(bir işin ən qızğın / gərgin vaxtı)*; **3.** yüksək təzyiqli sahə, antisiklon *(hava haq.)*
**high**[2] [haı] *adj* **1.** yüksək, hündür, qəlbi; **a ~ mountain** hündür dağ; **the ~est point of the range** dağ silsiləsinin ən hündür/yüksək nöqtəsi; **~ ground** yüksəklik, yüksək yer; *The house was built on high ground Ev hündür yerdə tikilib*; **2.** müəyyən hündürlük, ucalıq; **a tree thirty meters ~** otuz metr hündürlükdə ağac; *The snow was half-leg high Qar diz hündürlüyündə idi; How high is the mountain? Bu dağın hündürlüyü nə qədərdir?*; **3.** çox güclü, təsirli, yüksək; **~ temperature / fever** yüksək hərarət; **~ pressure** yüksək təzyiq; **~ speed** yüksək sürət; **~ pulse rate** *tib.* tez-tez vuran nəbz; **4.** baha, böyük, çox, yüksək; **~ price** baha/yüksək qiymət; **~ rent** yüksək kirə / icarə haqqı; **~ money** *amer.* böyük / çox pul; **~ rate of interest** yüksək / çox faiz *(gəlir, mənfəət və s. faizi)*; **~ stake** ortaya qoyulan/banka atılan çox böyük məbləğdə pul *(qumar oyununda)*; **to play for ~ stakes** böyük məbləğdə qumar oynamaq; **to pay ~ taxes** yüksək vergi ödəmək; *Living is high Güzəran/Dolanışıq çox ağırdır*; **to buy** ***smth.*** **at a ~ figure** bir şeyi çox baha qiymətə almaq; **5.** güclü, böyük, möhkəm, intensiv, gərgin, qızğın; **~ wind** güclü külək; **~ heat** möhkəm isti; **~ colours** aydın / parlaq rənglər; **~ diet / feeding** güclü yemək/qidalanma; doyumlu / tutumlu yemək; **6.** ən qızğın çağda / vaxtda olan/baş verən; **~ summer** yayın oğlan/ən qızğın çağı; **at ~ noon** düz günorta vaxtı; **~ day** günün günorta çağı; *It was high day when this happened Bu, günün günorta çağı baş verdi; It is high time for us to go Bizim lap getmək vaxtımızdır*; **7.** ali, ali təbəqə; **~ officials** yüksək rütbəli məmurlar/rəsmi şəxslər; **~ office** baş idarə; **persons in ~ position** yüksək vəzifəli şəxslər; **position of the ~est importance** çox məsul vəzifə; **to appoint** ***smb.*** **to a ~er post** bir kəsi daha yüksək vəzifəyə təyin etmək; **8.** ən yaxşı /yüksək; **~ quality** əla/ən yaxşı keyfiyyət; **~ merit** böyük ləyaqət; **to hold** ***smb.*** **in ~ respect** bir kəsə çox hörmət etmək; **to have a ~ opinion of** ***smb.*** bir kəs haqqında yüksək fikirdə olmaq; **in the ~est sense of the word** sözün əsl mənasında; **to deserve ~ praise** yaxşı tərifə layiq olmaq; **9.** yüksək, nəcib, alicənab; **~ thoughts/feelings** nəcib fikirlər/hisslər;

~ **ideals** yüksək ideallar; ~ **aims** ali/yüksək məqsədlər; **a man of ~ character** alicənab insan; **10.** zil, çox güclü, gur *(səs haq.)*; ~ **pitch / tone** yüksək ton; ~ **voice** güclü səs; *The violin is not high enough Skripka kifayət qədər zildə köklənməyib*; **11.** şən, şad, sevincli, fərəhli; ~ **spirits** şən əhval-ruhiyyə, şad əhval; ~ **jinks** vaxtı şən keçirmə, şadyanalıq; **to have a ~ time** vaxtı yaxşı keçirmək, yaxşıca şənlənmək; **12.** *d.d.* sərxoş, kefi yuxarı/kök olan, kefli; *He was high and didn't know what he was saying O, kefli/ sərxoş idi və nə dediyini özü də anlamırdı*; **13.** harın, qızğın *(at haq.)* ~ **action** oynaqlıq, şuxluq *(at haq.)*; **14.** varlı, dövlətli, dəbdəbəli, cah-calallı; ~ **living** cah-calallı həyat, firavan yaşayış; **15.** ağırlaşmış, qoxumuş; *This meat is rather high Bu ət bir az ağırlaşıb; This meat has rather a high flavour Bu ət bir az iy verir*;

◊ **the ~sea(s) 1)** açıq dəniz; **2)** güclü dalğa; ~ **Tory** ifrat mühafizəkar, konservator; ~ **words** ciddi söhbət, yüksək tonla danışma; ~ **life** kübar həyat; **The Most High** *din.* Haqq-taala; **with a ~ hand** hökmlə, amiranə *(bir surətdə)*; **on the ~ ropes** əsəbi, həyəcanlı vəziyyətdə; **to ride/to mount /to be on the ~ horse,** *amer.* **to get the ~ hat** iddia satmaq, təkəbbürlənmək, təşəxxüs satmaq, özünü çəkmək, lovğalanmaq

**high**[3] [haɪ] *adv* **1.** uca, hündür, yüksək; **to climb ~** hündürə qalxmaq, hündürə dırmaşmaq; ~ **up the Thames** Temza boyu üzüyuxarı; **to hold one's head ~** başını dik tutmaq; **to fly ~** hündürdən uçmaq; **2.** güclü, intensiv, tez-tez; *The wind blows high Güclü külək əsir; Her heart beat high Onun ürəyi tez-tez vururdu*; **3.** baha, baha qiymətə; **to pay ~** baha başa gəlmək; *He went as high as £ 200 O, 200 funt verməyə/ödəməyə hazır idi*; **4.** zəngin, dəbdəbəli, cah-calallı; **to live ~** dəbdəbəli/cah-calallı həyat sürmək, firavan yaşamaq; **to feed ~** kökəltmək, bəsləmək;

◊ **to fly ~** yüksək iddiası olmaq, şöhrətpərəstlik niyyətində olmaq; **to run ~ 1)** qabarmaq *(dəniz haq.)*; **2)** *məc.* göylərdə uçmaq, göylə getmək; *Passions ran high Ehtiraslar qızışdı*; ~ **and low** hər yerdə / yanda / tərəfdə

**highball** ['haɪbɔ:l] *n* **1.** *d.d.* haybol *(hündür qədəhdə verilən sodalı və buzlu viski)*; **2.** poker oyununun bir növü; **3.** *hərb.* rəsmi təzim etmə; **4.** *amer. d.y.* "yol açıqdır" *(xəbərdarlıq)*; yoladüşmə siqnalı

**high-binder** ['haɪ.baɪndəʳ] *n amer. jarq.* **1.** xuliqan; **2.** şübhəli adam, fırıldaqçı, dələduz

**high-blown** ['haɪbloun] *adj* **1.** çox şişirdilmiş; **2.** təşəxxüslü, məğrur; qəliz, təmtəraqlı

**high-board** ['haɪbɔ:d] *n id.* suya tullanmaq üçün qüllə / vışka; ~ **diver** qüllədən suya tullanan idmançı; ~ **diving** qüllədən suya tullanma

**high-born** ['haɪbɔ:n] *adj* əsilzadə, əsil-nəcabətli, kübar

**high-boy** ['haɪbɔɪ] *n* hündür kamod *(siyirməli paltar şkafı)*

**high-bred** ['haɪbred] *adj* **1.** cins, əsil; **2.** yaxşı tərbiyə görmüş, ədəbli, ədəb-ərkanlı

**highbrow**[1] ['haɪbrau] *n* **1.** ziyalılıq/incə zövqlülük iddiasında olan adam; "ağıl dəryası"; **2.** çox da dərin olmayan alim / ziyalı

**highbrow**[2] ['haɪbrau] *adj istehz.* **1.** elmli, bilikli, çox oxumuş; ~ **literature** sanballı, ciddi ədəbiyyat; seçmə, imtiyazlı şəxslər üçün nəzərdə tutulmuş ədəbiyyat; **2.** lovğa, təkəbbürlü, iddialı, başqalarına xor baxan

**high-browed** ['haɪbraud] *adj* **1.** gen/açıq/ iri alınlı; **2.** = **highbrow**[2] *(1-ci mənada)*

**High Church** ['haɪ'tʃə:tʃ] *n* katolisizmə meylli kilsə

**High Churchman** ['haɪ'tʃə:tʃmən] *n (pl* **-men** [-men]) katolisizmə meylli kilsə tərəfdarı / təəssübkeşi

**high-class** ['haɪ'kla:s] *adj* birinci dərəcəli, əla; ~ **hotel** birinci dərəcəli hotel, mehmanxana; ~ **cooking** əla / birinci dərəcəli mətbəx

**High Court (of Justice)** ['haɪ'kɔ:t(əv 'dʒʌstɪs)] *n* Ali Ədalət Məhkəməsi *(İngiltərə ali məhkəməsinin tərkibinə daxildir)*

**high-cranberry** ['haɪ.krænbərɪ] *n bot.* başınağacı, mərcanlı *(quşüzümünün bir növü)*

**high-day** ['haɪdeɪ] *n* bayram, bayram günü; **~s and holidays** bayram və tətil günləri

**high-explosive**[1] ['haɪks'plousɪv] *n* güclü partlayıcı maddə

**high-explosive**[2] ['haɪks'plousɪv] *adj hərb.* fuqas, partlayıcı; ~ **bomb 1)** fuqas bombası; **2)** fuqas minası *(minamyotdan atılan)*; ~ **shell** qəlpələnən fuqas qumbarası

**high-falutin**[1] ['haɪfə'lu:tɪn] *n d.d.* təmtəraqlılıq, ibarəlilik, qəlizlik

**high-falutin**[2] ['haɪfə'lu:tɪn] *adj* təmtəraqlı, qəliz ibarəli; ~ **language** qəliz /ibarəli dil

**high-fidelity** ['haɪfɪ'delɪtɪ] *n* səsləndirmənin və ya yenidən səsləndirmənin yüksək dəqiqliyi

**high-flier** ['haɪ'flaɪəʳ] *n* = **high-flyer**

**high-flown** ['haɪfloun] *adj istehz.* göylə gedən, təmtəraqlı, dəbdəbəli, ibarəli, qəliz; ~ **phrases/style** təmtəraqlı nitq/üslub

**high-flyer** ['haɪ.flaɪəʳ] *n* **1.** çox hündürdən uçan *(quş haq.)*; **2.** göylə gedən, şöhrətpərəst *(adam)*; **3.** ifrat mühafizəkar

**high-grade**[1] ['haɪ'greɪd] *n* **1.** yüksək keyfiyyət; **2.** dik yoxuş *(yol haq.)*

**high-grade**[2] ['haɪ'greɪd] *adj* **1.** yüksək keyfiyyətli, birinci dərəcəli, əla; ~ **goods** yüksək keyfiyyətli mal; **2.** zəngin *(filiz, xam mədən haq.)*; **3.** dik *(yoxuş haq.)*

**high-handed** ['haɪ'hændɪd] *adj* **1.** özbaşına, öz bildiyini edən; **2.** ixtiyar sahibi, səlahiyyəti olan; **to be ~ with** *smb.* bir kəsi itaətdə saxlamaq, bir kəsin cilovunu əlində saxlamaq

**high-handedness** ['haɪ'hændɪdnɪs] *n* özbaşınalıq, başlı-başınalıq, istibdad, zorakılıq



**high-hat**[1] ['haɪ'hæt] *n* **1.** silindr *(təpəsi hündür bərk şlyapa)*; **2.** *d.d. məc.* böyük adam, böyük zat/şəxs; **3.** lovğa/dikbaş adam

**high-hat**[2] ['haɪ'hæt] *v d.d.* etina etməmək, saymamaq, xor baxmaq, məhəl qoymamaq

**high-hearted** [haɪ'ha:tɪd] *adj* **1.** cəsarətli, qoçaq, igid, cəsur, qurd ürəyi yemiş; geniş ürəkli, açıq qəlbli, xeyirxah; **2.** *arx.* dikbaş, lovğa, təkəbbürlü

**high-heat** ['haɪhi:t] *adj* odadavamlı

**highjack** ['haɪdʒək] *v* = **hijack**

**high-jump** ['haɪdʒʌmp] *n id.* hündürlüyə hoppanma / tullanma

**high-jumper** ['haɪ.dʒʌmpəʳ] *n* hündürlüyə tullanan / hoppanan idmançı

**highland** ['haɪlənd] *n* **1.** yayla; yüksək dağlıq yer; **2.** *pl* dağlıq ölkə/yer; **the Highlands** şimali və şimal-qərbi Şotlandiya

**Highlander** ['haɪləndəʳ] *n* **1.** dağlı; **2.** Şotlandiya dağlısı; **3.** Şotlandiya alayının əsgəri; **4.** Şotlandiya cinsi *(mal-qara haq.)*

**high-light** ['haɪlaɪt] *n* **1.** işıq effekti; işıq ləkəsi/zolağı; **2.** məğz, əsas, ən başlıca / ən əsas cəhət; **3.** məqam, an; **the ~ of the performance** tamaşanın kulminasiya məqamı; *There were no high-lights in the match Yarışda heç bir gərgin an olmadı*; **the ~ of the week's events** həftənin mühüm/əsas hadisələri;

◊ **to be in /to hit the ~** diqqət mərkəzində olmaq

**highly** ['haɪlɪ] *adv* **1.** çox, olduqca, artıq, dedikcə, son dərəcə, hədsiz/müstəsna dərəcədə; **a ~ amusing film** çox əyləncəli film; **a ~ gifted poet** olduqca istedadlı şair; **a ~ original opinion** son dərəcə orijinal fikir/mülahizə; **a ~ respectable person** olduqca/çox hörmətli adam/şəxs; **to value ~** yüksək qiymətləndirmək; **to be ~ pleased** olduqca məmnun olmaq, çox razı qalmaq; **to be ~ dangerous** son dərəcə qorxulu/təhlükəli olmaq; **2.** yüksək, çox; **a ~ placed official** yüksək mövqeli məmur; **a ~ paid worker** yüksək maaşlı fəhlə; **a ~ developed industry** çox /yüksək inkişaf etmiş sənaye; **3.** yaxşı, xeyirxahlıqla, iltifatla, yüksək; **to speak ~ of** *smb.* bir kəs haqqında xeyirxahlıqla danışmaq/yaxşı fikir söyləmək; **to think too ~ of oneself** özü haqqında çox yüksək fikirdə olmaq

**high-minded** ['haɪ'maɪndɪd] *adj* nəcib, alicənab, mərd, comərd

**highness** ['haɪnɪs] *n* **1.** hündürlük, yüksəklik, alilik, ucalıq, boy; **the ~ of the wall** divarın hündürlüyü; **the ~ of his aims** onun məqsədlərinin aliliyi; **2. Highness** Əlahəzrət; zatinəcabətləri, zatihəşəmətləri; *Your Highness! Əlahəzrət!*

**high-pressure** ['haɪ'preʃəʳ] *adj* **1.** yüksək təzyiqli; ~ **air compressor** yüksək təzyiqli hava kompressoru; ~ **tyre** yüksək təzyiqli pnevmatik şin *(təkər qurşağı)*; **2.** ciddi təsir vasitələrindən istifadə edən, təsir / təzyiq edən; **3.** gərgin

**high-ranking** ['haɪ.ræŋkɪŋ] *adj hərb.* yüksək vəzifəli, yüksək mövqe tutan; ~ **military official** hərbi müəssisənin yüksək vəzifəli rəsmi nümayəndəsi; ~ **officer** yüksək rütbəli zabit; general

**high-relief** ['haɪrɪ'lɪ:f] *n mem.* qorelyef *(naxış)*

**high-road** ['haɪ'roud] *n* = **highway**; **the ~ to fame** şöhrətə gedən düz yol; *Is there a high-road to happiness Xoşbəxtliyə aparan düz yol varmı?*

**high-scaler** ['haɪ'skeɪləʳ] *n* kəlləçarxçı *(uca yerlərə çıxıb işləyən usta / mahir fəhlə)*

**high school** ['haɪ'sku:l] *n* orta məktəb

**high-seasoned** ['haɪ'si:znd] *adj* acı, tünd, çox ədviyyat vurulmuş *(xörək)*; ~ **dishes** acı / çox ədviyyat vurulmuş xörəklər

**high-sounding** ['haɪ.saundɪŋ] *adj* **1.** gur, gur səsli; gurultulu; **2.** *məc.* gurultulu, təmtəraqlı; ~ **words** gurultulu/təmtəraqlı sözlər; **3.** dəbdəbəli, qəşəng, gözəl *(moda haq.)*

**high-speed** ['haɪ'spi:d] *adj* **1.** sürətli, itigedən; ~ **ship** itigedən/sürətli gəmi; **2.** böyük sürətlə işləyən; ~ **camera** böyük sürətlə işləyən fotokamera

**high-spirited** ['haɪ'spɪrɪtɪd] *adj* **1.** qoçaq, igid, cəsur, ürəkli, şücaətli, cəsarətli, cürətli; **2.** coşğun, qızğın, ehtiraslı, dəliqanlı; **3.** şux, oynaq; şad, şən, sevincli, yaxşı əhval-ruhiyyəli, əhvallı

**high-stomached** ['haɪ'stʌməkt] *adj arx.* **1.** igid, cəsur, qoçaq, mərd, ürəkli, ciyərli; **2.** məğrur, vüqarlı; **3.** təkəbbürlü, lovğa, dikbaş

**high-strung** ['haɪ'strʌŋ] *adj* **1.** həssas; tez mütəəssir olan, ürəyi nazik/yuxa; **2.** əsəbi; *She is high-strung Onun əsəbləri gərilib / tarıma çəkilib*

**high-tension** ['haɪ'tenʃn] *adj el.* yüksək gərginlikli, yüksəkvoltlu

**high-tide** ['haɪtaɪd] *n dən.* qabarma, artma, yüksəlmə *(dəniz suyu haq.)*

**hightoned** ['haɪ'tound] *adj* **1.** zil *(səs haq.)*; **2.** *istehz.* əsil, əsilzadə; təkəbbürlü, iddialı, başqalarına xor baxan; **3.** *amer. d.d.* ədalı; işvəli; nəzakətli, ədəb qaydalarına riayət edən *(kübar nöqteyi-nəzərdən)*; **4.** əla, birinci dərəcəli

**high treason** ['haɪ'tri:zn] *n* dövlətə /vətənə xəyanət

**high-up**[1] ['haɪ'ʌp] *n* yüksək vəzifəli/yüksək mövqe tutan şəxs; görkəmli/mühüm sima/şəxsiyyət; sözükeçən/nüfuzlu adam

**high-up**[2] ['haɪ'ʌp] *adj d.d.* **1.** hündürdə/ ucada yerləşən; **2.** yüksək vəzifəli/mövqeli; görkəmli, nüfuzlu; ~ **man** sözükeçən / nüfuzlu adam

**high-voltage** ['haɪ'voultɪdʒ] *n* = **high tension**

**high-water** ['haɪ'wɔ:təʳ] *n* **1.** = **high-tide**; **2.** sel, daşqın; güclü sel

**high-water mark** ['haɪ.wɔ:tə'ma:k] *n* **1.** *dən.* dəniz suyunun səviyyəsi *(qabarma zamanı)*; **2.** *məc.* ən böyük uğur; zirvə; **the ~ of English poetry** ingilis poeziyasının zirvəsi

**highway[1]** ['haɪweɪ] *n* **1.** geniş yol, şose, magistral avtomobil yolu, ana xətt *(yolun)*; avtostrada *(ikitərəfli avtomobil yolu)*; əsas yol, ticarət yolu; **the ~ to India** Hindistana gedən ticarət yolu; **2.** *məc.* ana / əsas yol, şahrah; düz/ən kəsə yol; **to be on the ~ to success** müvəffəqiyyətə gedən /uğura gedən düz yolda olmaq

**highway[2]** ['haɪweɪ] *adj*: **~ engineering** yol tikinti texnikası; **~ regulation** avtomobil yollarının tənzimlənməsi; **~ service** avtomobil nəqliyyatı/vasitəsi

**highwayman** ['haɪweɪmən] *n (pl* **-men** [-mən]) quldur, yolkəsən, çapqınçı, soyğunçu *(şose yolunda)*

**hijack** ['haɪdʒæk] *v* **1.** avtomobili və s. yolda saxlayıb soymaq/qarət etmək; bir şeyi bir kəsdən zorla tutub almaq, zorla soymaq; **to ~ a train** qatara basqın/hücum etmək; **2.** hava quldurluğu ilə məşğul olmaq; **to ~ a plane** təyyarə qaçırmaq

**hijacker** ['haɪ.dʒækəʳ] *n* quldur, çapqınçı, yolkəsən, bandit, soyğunçu, hava quldurıı *(xüs. avtomobili, təyyarəni və s. qarət edənlər / qaçıranlar haq.)*

**hijacking** ['haɪ.dʒækɪŋ] *n* basqın, qarət, soyğun, talan, soyğunçuluq; *Hijacking civil aircraft has become rather common Mülki təyyarələrin qaçırılması/qarət edilməsi adi hal alıb; Hijacking is a crime Təyyarə qaçırmaq cinayətdir*

**hike[1]** [haɪk] *n* **1.** *d.d.* uzun-uzadı/uzunsürən yürüş/gəzinti; ekskursiya; piyada səyahət; **2.** *amer. hərb.* nizamla addımlama

**hike[2]** [haɪk] *v* **1.** yürüşə/piyada səyahətə çıxmaq; piyada getmək; veyllənmək, avara-avara gəzmək/dolanmaq/dolaşmaq; **to ~ about the country** ətraf yerlərdə/civarda dolaşmaq; *We hiked it there Biz ora piyada getdik*; **2.** *hərb.* nizamla addımlamaq

**hiking** ['haɪkɪŋ] *n* **1.** piyada gəzinti, ekskursiya; **2.** turizm

**hilarious** [hɪ'leərɪəs] *adj* şən, şux, şad, xoştəbiət, sevincli; səs-küylü, gurultulu

**hilarity** [hɪ'lærɪtɪ] *n* səs-küylü, gurultulu əyləncə, şənlik; şadlıq, dilxoşluq, nəşə; *His speech was received with high hilarity Onun nitqi gurultulu sevinclə qarşılandı*

**Hilary** ['hɪlərɪ] *n mövlud bayramından başlayan və pasxa bayramına qədər davam edən semestr (Oksford və Dublin universitetlərində)*

**hill[1]** [hɪl] *n* **1.** təpə; hündür yer, təpəlik; **sharp / steep ~** şiş / dik təpə; dik yoxuş; **landing ~** yerə enmə təpəsi *(ayaq xizəyi idmanında)*; **2.** yığın, topa, qalaq; **3.** *k.t.* oyuq, çuxur, çala;

◊ **~ of beans** heç nə, boş/əhəmiyyətsiz /cüzi şey; **to a ~ of beans** heç nəyə dəyməmək, əhəmiyyəti olmamaq; **to go over the ~ 1)** *jarq.* həbsxanadan qaçmaq; **2)** *hərb.* fərarilik etmək, əsgərlikdən qaçmaq; **as old as the ~s** dağlar qədər qoca

**hill[2]** [hɪl] *v* **1.** qalaqlamaq, təpə düzəltmək; **2.** *k.t.* dibini doldurmaq/yumşaltmaq; **to ~ up potatoes** kartof kolunun dibini doldurmaq

**hill-billy[1]** ['hɪl.bɪlɪ] *n amer. d.d.* dağlı, yoxsul kəndli *(xüs. cənub ştatlarının dağlıq rayonlarında yaşayanlar haq.)*

**hill-billy[2]** ['hɪl.bɪlɪ] *adj* kənd, kəndli; **~ songs** xalq mahnıları; **~ band** xalq çalğı alətləri orkestri

**hilliness** ['hɪlɪnɪs] *n* təpəlik

**hilling** ['hɪlɪŋ] *n k.t.* dibini doldurma/ yumşaltma *(bitkinin)*

**hillock** ['hɪlək] *n* təpəcik, kiçik təpə; torpaq koması / topası; iri kəsək

**hill-side** ['hɪl'saɪd] *n* dağın / təpənin döşü; yamac

**hill-spacing** ['hɪl.speɪsɪŋ] *n k.t.* çalalar arasındakı məsafə, çala arası *(səpində)*

**hill-top** ['hɪl'tɔp] *n* təpənin başı, dağın təpəsi

**hilly** ['hɪlɪ] *adj* təpəli, təpəlik; **~ country** təpəlik yer / ölkə

**hilt** [hɪlt] *n* dəstə, qəbzə *(qılıncda, xəncərdə və s.)*; ◊ **to prove a charge up to the ~** ittihamı tamamilə sübuta yetirmək; **to live up to the ~** dolğun/firavan bir həyat sürmək

**him** [hɪm] *tam forması*; [ɪm] *zəif forması* **1.** "he" *(III şəxs təkdə kişi cinsi üçün)* şəxs əvəzliyinin obyekt halı: onu, ona; *Mr. Smith is in the town; I saw him yesterday Cənab Smit şəhərdədir; Mən onu dünən gördüm; Give him the money Pulu ona ver/ verin*; **2.** *d.d.* o; *That is him Bu odur*

**himself** [hɪm'self] *(tam forması)*; [ɪm'self] *(zəif forması); refl. pron. (III şəxs təkdə kişi cinsi üçün)* **1.** özünü, özünə, özündən; *He is no longer master of himself O artıq özünü idarə edə bilmir; He came to himself in a strange room O tanımadığı bir otaqda özünə gəldi; He examined himself in the mirror O, güzgüdə özünə baxdı; He put himself a question O özünə sual verdi; He ought to be ashamed of himself O gərək özündən utansın*; **2. (all) by ~** tək, tənha; özü tək; *He was all by himself O tamamilə tək idi; Can he do it by himself O özü tək bunu edə bilərmi?*; **3.** *emph. pron.* özü, özünü; *He drives the car himself O, maşını özü sürür; He says so himself O özü belə deyir; He cannot understand it himself O özü bunu başa düşə bilmir; Did you see the manager himself Sən/Siz rəisin özünü gördünmü? / gördünüzmü?;*

◊ *He's not himself O özündə deyil; He looks himself again O yenidən özünə gəlib; He keeps himself to himself O başqalarının işinə qarışmır; Richard is himself again Riçard hələ sağdır*

**hind[1]** [haɪnd] *n* I *zool.* xallı maral *(dişisi)*

**hind** [haɪnd] *n* II **1.** muzdur; fermada işləyən evli muzdur; **2.** kəndli-kütlü, avam

**hind[2]** [haɪnd] *adj* arxa, dal; **~ leg** dal ayaq; **~ wheel** dal təkər; **~ quarters 1)** *kob.* dal, göt *(adamın)*; **2)** cəmdəyin arxa/dal hissəsi



**hinder[1]** ['hɪndəʳ] *adj* arxa, dal; **the ~ part / side** arxa tərəf; **~ part before** dalı-dalı, tərs, dalqabaq

**hinder[2]** ['hɪndəʳ] *v* **1.** mane olmaq, maneçilik /çətinlik /əngəl törətmək; **to ~ smb.** bir kəsə mane olmaq; *Don't hinder me! Mənə mane olma!/olmayın!; I have much business that has hindered my answering your letter Mənim çoxlu işim var və bu sənin/sizin məktubuna/məktubunuza cavab verməkdə mənə mane oldu*; **to ~ smb. in smth.** bir şeydə bir kəsə maneçilik törətmək/mane olmaq; *I was hindered in my work İşimdə mənə mane oldular*

**hind-head** ['haɪndhed] *n arx.* ənsə; peysər, boynun ardı

**Hindi[1]** ['hɪn'di:] *n* hindi dili

**Hindi[2]** ['hɪn'di:] *adj* hindi dilinə aid olan

**hindmost** ['haɪnmoust] *adj* **1.** lap arxa, ən axırıncı; **2.** ən uzağı

**Hindoo[1]** ['hɪn'du:] *n* = **Hindu[1]**

**Hindoo[2]** ['hɪn'du:] *adj* = **Hindu[2]**

**hindrance** ['hɪndrəns] *n* maneə, əngəl, maneçilik; *It was a great hindrance to my studies Bu mənim dərslərimə çox böyük maneçilik/əngəl törədirdi; You are more of a hindrance than a help Sən/Siz köməkdən çox, mane olursan/olursunuz*; **to remove a ~** maneəni aradan qaldırmaq

**Hindu[1]** [.hɪn'du:] *n* hindu

**Hindu[2]** [.hɪn'du:] *adj* hindus, hindulara məxsus

**Hinduism** ['hɪndu:ɪzm] *n* hinduizm *(əksər hinduların dini)*

**Hindustani[1]** [.hɪn'dusta:nɪ] *n* **1.** hindu dili; **2.** hindli

**Hindustani[2]** [.hɪn'dusta:nɪ] *adj* hindlilərə məxsus

**hinge[1]** [hɪndʒ] *n* **1.** həncama, şarnir; qapı həncaması, rəzə; *The door is off its hinges Qapı həncamadan çıxıb*; **2.** *məc.* mahiyyət, məğz, əsas mətləb, əsas; **the ~ of the conversation** söhbətin məğzi / əsas mahiyyəti

**hinge[2]** [hɪndʒ] *v* **1.** həncamadan asmaq; həncama salmaq; **2.** həncamada fırlanmaq, hərəkət etmək, həncamadan asılmaq; **3.** bir şeyin ətrafında fırlanmaq, bir şeydən asılı olmaq; *Their whole policy hinges on this alliance Onların bütün siyasəti bu ittifaqdan asılıdır; Everything hinges on his decision Hər şey onun qərarından asılıdır*

**hinny[1]** ['hɪnɪ] *n* at qatırı *(ayqırla eşşəkdən törəyən mələz)*

**hinny[2]** ['hɪnɪ] *v* kişnəmək

**hint[1]** [hɪnt] *n* **1.** işarə, eyham, him, him-cim; **delicate/gentle ~** incə eyham/işarə/him-cim; **broad ~** açıq eyham; **to give/to drop smb. a ~** bir kəsə işarə/him etmək, eyham vurmaq; *Sarah gave him a hint that she would like him to leave Sara eyhamla ona anlatdı ki, o onun çıxıb getməsini istərdi*; **to take a ~** eyhamı başa düşmək; **2.** məsləhət; **~s on housekeeping, ~s for housewives** evdarlıq məsləhətləri, evdar qadınlar üçün məsləhətlər; *Can you give me some hints how to do this? Sən/Siz bunu necə etmək barədə mənə məsləhətlər verə bilərsənmi?/bilərsinizmi?*

**hint[2]** [hɪnt] *v* işarə etmək, eyham vurmaq, söz atmaq, eyhamla başa salmaq, him-cim etmək; *He hinted that he knew more O, eyhamla bildirdi ki, o daha çox bilir; He hinted that he would like to be invited O, eyhamla bildirdi ki, o da dəvət olunmaq istərdi*; **to ~ at smth.** bir şeyə işarə etmək, bir şeyin əlaməti olmaq, bir şeydən xəbər vermək; *The little gusts of wind hinted at a storm to follow Küləyin ani şiddətləri onun ardınca tufanın gələcəyindən xəbər verirdi*

**hinterland** ['hɪntəlænd] *n* **1.** ölkənin içində yerləşən rayonlar; sərhəddən uzaq rayonlar; **2.** *hərb.* arxa, cəbhə arxası

**hip[1]** [hɪp] *n* I **1.** omba, bud *(yuxarı hissəsi)*, böyür, çanağın hər tərəfi; **measurement round the ~s** ombanın / budların yuxarı hissəsinin dairəvi ölçüsü; *He stood there with his hands on his hips O, əllərini belinə qoyub orada dayanmışdı*; **2.** *mem.* dam örtüyünün qabırğası;

◊ **to have / to get smb. on the ~** bir kəsdən üstün olmaq; bir kəsi öz əlində saxlamaq; **~ and thigh** amansızcasına, amansızlıqla; **to smite the enemy ~ and thigh** düşmənin dizini/belini qırmaq; düşməni amansızlıqla darmadağın/yerlə yeksan etmək

**hip** [hɪp] *n* II itburnu / həməşür meyvəsi

**hip** [hɪp] *n* III ümidsizlik, məyusluq, ruhdan düşmə; **to have the ~** ürəyi sıxılmaq, qüssələnmək

**hip[2]** [hɪp] *v* **1.** ombasını çıxartmaq /burxutmaq; **2.** axsamaq, yeriyərkən dingildəmək

**hip[3]** [hɪp] *int.* **1.** ey!; **2.** Hip, hip, hurrah! Hop, hop, Ura!; Ura!, Ura!

**hip-bath** ['hɪpba:θ] *n* yarımbədən/oturmaq üçün vanna

**hippie** ['hɪpɪ] *n* hippi; **the ~s** hippilər *(mövcud əxlaq normalarını və həyat tərzini inkar edən və öz etirazlarını əcaib geyimləri və davranışları ilə ifadə edən gənclər)*

**hippo** ['hɪpou] *n d.d.* **hippopotamus** *isminin qısa forması*

**hippocampi** [.hɪpou'kæmpaɪ] *n* **hippocampus** *isminin cəm forması*

**hippocampus** [.hɪpou'kæmpəs] *n (pl* **-pi**) *yun. əs.* **1.** hippokamp, Neptunun cəng arabasına qoşulan dəniz atı; **2.** *zool.* dəniz atcığı *(balıq növü)*

**hip-pocket** ['hɪp.pɔkɪt] *n* şalvarın dal cibi

**Hippocrates** [hɪ'pɔkrəti:z] *n* Hippokrat; həkim

**Hippocratic** [.hɪpə'krætɪk] *adj* **1.** Hippokrata məxsus; **2.** *tib.* **~ face** "Hippokrat sifəti, ölümün yaxınlaşmasını göstərən sifətdəki dəyişikliklər; **~ oath** Hippokrat andı

**hippodrome** ['hɪpədroum] *n* cıdır meydanı

**hippopotamus** [.hɪpə'pɔtəməs] *n (pl* **-es** [-sɪz] *həm də* **-mi** [-maɪ]) zool. hippopotam, begemot

**hippy** ['hɪpɪ] *n* = **hippie**

**hire¹** ['haɪəʳ] *n* **1.** kirayə, birovuz, kirayə etmə, kirayələmə, icarə, icarəyə götürmə; **to let** ***smth.*** **on** ~ bir şeyi icarəyə/kirayəyə vermək; **to take** ***smth.*** **on** ~ bir şeyi icarəyə götürmək; *The hall is on hire Salon icarəyə verilir;* **2.** kirayə/icarə haqqı; muzd; **to pay** ~ kirayə/icarə haqqını ödəmək; muzdu ödəmək; **to work for** ~ muzdla işləmək

**hire²** ['haɪəʳ] *v* **1.** muzdla tutmaq/işə götürmək; **to ~ a gardener/a worker** bağban/ fəhlə tutmaq; **to ~ a worker by the day** günəmuzd fəhlə tutmaq; **2.** kirayə etmək, kirayəyə/icarəyə götürmək; **to ~ a horse/ a concert hall** at / konsert salonu icarəyə götürmək; **to ~ a car** maşın icarəyə götürmək; **to ~ oneself out for a living** dolanmaq üçün muzdla işləmək; **to ~ out** kirayəyə/icarəyə vermək

**hired** ['haɪəd] *adj* **1.** muzdlu; muzdla tutulmuş /işləyən; **a ~ troops** muzdlu ordu; **a ~ assassin** muzdla tutulmuş qatil; **a ~ man** muzdur, fəhlə; **a ~ girl** fermada işləyən qız, ev qulluqçusu; **2.** icarəyə götürülmüş, kirə edilmiş; **~ car** icarəyə götürülmüş avtomobil

**hireling** ['haɪəlɪŋ] *n* muzdur; satqın/pula satılmış adam, əlaltı; **the ~s of the press** pula satılmış cızma-qaraçı *(mühərrir); He is hireling at heart O, satqının biridir, O, qəlbən satqındır*

**hire-purchase** ['haɪə'pɜ:tʃəs] *n* **1.** möhlətli alış /satış; möhlətli alışın/satışın əlahiddə bir növü; **2.** icarəyə götürülmüş şeyin müəyyən ödənişlər ödənildikdən sonra şəxsi mülkiyyətə keçməsi

**hire-system** ['haɪə'sɪstɪm] *n* = **hire-purchase**

**hirsute** ['hɜ:sju:t] *adj* **1.** tük basmış, uzun tüklü; **2.** tüklü, qıllı, qalıntüklü

**his** [hɪz] *(tam forması);* [ɪz] *(zəif forması) poss. pron. (III şəxs təkdə kişi cinsi üçün)* **1.** onun; *His house is far from here Onun evi buradan uzaqdır; Do you know his father and mother? Sən / Siz onun ata və anasını tanıyırsan?/tanıyırsınız?;* **2.** *Müəyyənlik artikli mənasında işlənir və Azərbaycan türkcəsinə tərcümə edilmir; He shrugged his shoulders O, çiyinlərini çəkdi; He fell on his back O, arxası üstə yerə yıxıldı;* **3.** *müstəqil işlənən forma: onunku, onun; This book is his Bu kitab onunkudur; Are you a friend of his Sən / Siz onun dostlarından birisənmi?/birisinizmi?;* **4.** özününkü; *He took my pen and his O, mənim qələmimi də, özününkünü də götürdü; These are my boots, his are near the fire Bu mənim çəkmənmdir, özününkü (onunku) buxarının yanındadır;*

◊ *His Majesty; His Excellency Əlahəzrət, Zati-aliləri*

**hiss¹** [hɪs] *n* fışıldama; fışıltı; fışqırıq; uğultu; vızıltı, vıyıltı; **the ~ of a snake** ilanın fısıltısı; **the ~ of a crowd** izdihamın fışqırığı/uğultusu

**hiss²** [hɪs] *v* **1.** fışıldamaq, vıyıldamaq, vızıldamaq; *The snake raised its head and hissed İlan başını qaldırdı və fısıldadı;* **2.** hirsindən boğula-boğula danışmaq, mızıldamaq, mırtıldamaq; *"You'll pay for this", he hissed (out) "Etdiklərin/Etdikləriniz mənə borc olsun", o boğula-boğula dedi;* **3.** fitə / fışqırığa basmaq; **to ~ an actor off the stage** aktyoru fitə basıb səhnədən qovmaq; **to ~ away /down / off / out** fitə basıb qovmaq; *The speaker was hissed off the rostrum Natiqi fitə basıb xitabət kürsüsündən qovdular*

**hist** [s:t] *int. sakit! ss! şş!*

**histiology** [hɪstɪ'ɔlədʒɪ] *n* = **histology**

**histology** [hɪs'tələdʒɪ] *n* histologiya *(orqanizm toxumalarının mikroskopik quruluşundan bəhs edən elm)*

**historian** [hɪs'tɔ:rɪən] *n* tarixçi

**historic** [hɪs'tɔrɪk] *adj* tarixi; **a ~ spot** tarixi yer; **a ~ event** tarixi hadisə; *He made a historic speech O, tarixi bir nitq söylədi*

**historical** [hɪs'tɔrɪkəl] *adj* tarixi, tarixə məxsus, tarixi nöqteyi-nəzərdən müəyyən olunmuş, doğru, həqiqi; **a ~ event** tarixi /doğru /həqiqətən baş vermiş hadisə; **a ~ novel** tarixi roman *(real hadisələr üzərində qurulmuş);* **a ~ film** tarixi hadisələri olduğu kimi göstərən film; **~ studies** tarixin araşdırılması, tarix elmi

**historically** [hɪs'tɔrɪkəlɪ] *adv* tarixən, tarixi baxımdan/nöqteyi-nəzərdən, tarixə görə, tarix baxımından

**historicity** [,hɪstə'rɪsɪtɪ] *n* tarixilik

**history** ['hɪstərɪ] *n* tarix, tarix elmi; **ancient ~** qədim tarix; **modern ~** yeni/müasir tarix; **medieval ~** orta əsrlər tarixi; **to make ~** tarix yaratmaq; **to go down in ~** tarixə daxil olmaq; **the ~ of the case** *tib.* xəstəliyin tarixi; *History repeats itself Tarix təkrar olunur;* **life ~** həyat tarixi;

◊ *That's ancient history! Keçmiş ola! Keçənə güzəşt deyərlər*

**histrionic** [,hɪstrɪ'ɔnɪk] *adj* **1.** səhnəyə/ aktyora aid, səhnə; **~ ability** səhnə bacarığı; **2.** süni, qeyri-təbii, qeyri-səmimi; **3.** *tib.* **~ paralysis** üz sinirinin mimiki iflici

**histrionics** [,hɪstrɪ'ɔnɪks] *n* **1.** teatr tamaşası; tamaşa; **2.** teatr mədəniyyəti; **3.** qeyri-təbiilik, sünilik

**hit¹** [hɪt] *n* **1.** zərbə, itələmə, təkan; **a ~ with hammer** çəkiclə zərbə; **a clever ~** sərrast zərbə; **2.** hədəfi vurma, hədəfə düşmə; **to score a ~** hədəfə düşmək; **to register a ~ on the target** hədəfə düşməni qeyd etmək; **to obtain a ~** *hərb.* hədəfi vurmaq, düz hədəfə düşmək; **3.** uğur, müvəffəqiyyət, uğurlu təşəbbüs, sınaq; **lucky ~** gözlənilməz uğur, bəxti gətirmə; **to get** ***smth.*** **by a lucky ~** xoşbəxt təsadüf sayəsində bir şeyi əldə etmək; *He made a hit with his songs O öz mahnıları ilə böyük uğur qazandı; A hit that will never come again Bir də belə xoş təsadüf olə düşməyəcək;* **~ parade** ən çox uğur qazanmış və ən çox satılan mahnı kassetlərinin siyahısı və ya mahnıların nümayişi; **4.** populyar müğənni/ifaçı, tamaşaçıların sevimlisi; **5.** hücum, düşmənçəsinə çıxış; zəhərli/istehzalı/acılayan/kinayəli fikir; *That is a hit at you Bu sənə/sizə qarşı düşməncəsinə çıxışdır; The play contained some clever hits at the fashions of the day Pyesdə müasir dəblər incə bir tərzdə lağa qoyulub*



**hit²** [hɪt] *v (pt, pp* **hit)** **1.** vurmaq, zərbə endirmək; **to ~** ***smth.*** **hard** bir şeyə güclü zərbə endirmək, bir şeyə bərk vurmaq; **to ~ fair** *id.* qaydanı pozmadan zərbə endirmək / vurmaq; **to ~ below the belt** *id.* **1)** qurşaqdan aşağı zərbə endirmək / vurmaq; **2)** *məc.* şərəfsizcəsinə hərəkət etmək; **to ~** ***smb.*** **on the head** bir kəsin başına vurmaq; **to ~** ***smb.*** **in the face** bir kəsin üzünə vurmaq; *A stone hit him, He was hit by a stone Ona daş dəydi;* **to ~ the ball over the fence** topu hasarın üstündən vurmaq; topu vurub hasarın üstündən keçirmək; **to ~** ***one's*** **head against a pole** başını dirəyə vurmaq; **2.** dəymək, toxunmaq; **to ~ against a wall** divara toxunmaq / dəymək; **3.** hədəfə vurmaq / düşmək, düz/sərrast vurmaq; **to ~ a target / home** düz hədəfə vurmaq; **to be ~ by a bullet** güllə yarası almaq; *He is hit O vurulub / yaralıdır; I fired but did not hit it Mən atəş açdım, ancaq atəş sərrast olmadı;* **to ~ the basket** *id.* topu səbətə salmaq *(basketbolda);* **4.** *məc.* toxunmaq, pərt etmək, qanını qaraltmaq; *You don't know whom your sarcasm may hit Sənin /Sizin bu istehzanın /istehzanızın kimə toxuna biləcəyini belə bilmirsən/bilmirsiniz; That hits the eye Bu gözə çarpır; He is hit in his pride Onun şəstinə/izzəti-nəfsinə toxunulub;* **5.** ziyan vurmaq, zərər çəkmək, əziyyət vermək / çəkmək; *They were hit by the famine Onlar aclıqdan əziyyət çəkdilər; I was hard hit by the news Bu xəbər mənə ağır zərbə oldu;* **6.** *(həm də* **to ~ on/upon)** tapmaq, təsadüf etmək, rast gəlmək, rastlaşmaq; **to ~ the right answer** düz/düzgün cavab tapmaq; **to ~ on a solution** həllini tapmaq; **to ~ upon a satisfactory explanation** qənaətbəxş izah tapmaq; **to ~ the right road/path** doğru yol tapmaq, düz yol seçmək; **7.** *məc.* düz yol tutmaq, düzgün hərəkət etmək, düz yola düşmək, yolunu azmamaq; *He hit upon an interesting passage in a book O, kitabda maraqlı bir yerə rast gəldi;* **to ~ a right word** münasib söz tapmaq; *We hit on a small valley Gözlənilmədən biz balaca bir vadiyə düşdük;* **8.** xoşuna gəlmək, ürəyinə yatmaq, uyğun gəlmək; **to ~** ***smb.'s*** **taste** bir kəsin zövqünə uyğun gəlmək; **to ~ the taste of the public** camaatın/tamaşaçıların xoşuna gəlmək; *How did it hit you? Xoşuna/Xoşunuza gəldimi?;* **9.** *d.d.* çatmaq, yetişmək, varmaq; *We hit the town at night Biz şəhərə gecə çatdıq;* **10.** *av.* yerə oturmaq/enmək, hündürlük yığmaq *(təyyarə haq.); The plane hit the ground Təyyarə yerə endi/oturdu;* **to ~ the ceiling** *av.* maksimum hündürlük yığmaq/ götürmək, maksimum hündürlüyə qalxmaq; **to ~ back** cavabını vermək, zərbəyə zərbə ilə cavab vermək; **to ~ off** dəqiq təsvir etmək, surətini /obrazını yaratmaq;

◊ **to ~ it** çox iti hərəkət etmək/yerimək; **to ~ the silk** *av.* paraşütlə tullanmaq; **to ~ it off with** ***smb.*** bir kəslə arası saz olmaq; **to ~ home** zəif damarını tutmaq; *You have hit it right Sən/Siz haqlısan /haqlısınız;* **to ~ the (right) nail on the head** düz tapmaq, lap/tamamilə yerinə düşmək

**hitch¹** [hɪtʃ] *n* **1.** təkan, dartınma, dartma; **to give** ***smth.*** **a ~** bir şeyi bərk çəkmək, bir şeyi təkanla dartmaq, bir şeyə təkan vermək; **2.** əngəl, manеə; ləngimə; təxir; **a ~ in the negotiations** danışıqlarda ləngimə/ təxir; **a ~ in the execution of a treaty** müqavilənin həyata keçirilməsinə əngəl/ maneə; **without a ~** rəvan, maneəsiz, əngəlsiz, çox rahat, yağ kimi; *Everything went off without a hitch Hər şey yağ kimi getdi;* **3.** azacıq axsama, qıçını çəkmə; **a ~ in** ***one's*** **gait** axsaq yeriş, yeriyərkən qıçını çəkmə; **4.** *jarq.* eyni istiqamətdə gedən maşınla pulsuz səyahət/səfər; **5.** birdən/qəflətən dayanma *(işləyən mexanizm haq.),* nasazlıq; *The blast-off was delayed by a technical hitch Texniki nasazlıq ucbatından kosmik gəminin buraxılması / startı təxirə salındı;* **6.** *dən.* düyün; **7.** qoşulan araba/prisep *(avtomobilə, traktora və s. qoşulan);*

◊ **this ~** *amer.* bu dəfəlik; **to make a ~ of it** *amer.* **1)** yola getmək, bir-birini anlamaq; **2)** bir şeydən yapışmaq, bir şey etməyə çalışmaq

**hitch²** [hɪtʃ] *v (həm də* **to ~ up)** **1.** dartmaq, çəkmək *(yuxarı),* təkan vermək, təkanla tərpətmək, itələmək *(dal/alt tərəfdən);* **to ~ up** ***one's*** **trousers** şalvarını yuxarı çəkmək; **to ~ up** ***one's*** **chair to the table** stulunu masanın/stolun yaxınına çəkmək; **2.** *(həm də* **to ~ on/to)** ilişdirmək, bağlamaq; **to ~ a horse to a fence** atı çəpərə bağlamaq; **to ~ rope over/round a bough** kəndiri budağa dolamaq, kəndiri kəmənd atıb budağa dolamaq; **3.** ilişmək; *Her dress hitched on a nail Onun paltarı mıxa ilişdi;* **4.** qoşmaq; **5.** *amer. d.d.* evlənmək; *He's hitched up at last Nəhayət ki, o evləndi;* **6.** azacıq axsamaq, qıçını çəkmək, axsaya-axsaya yerimək; **7.** uyğun/düz gəlmək, tutmaq, uzlaşmaq; *These two accounts don't hitch in with each other Bu iki hesabat/məlumat bir-birinə uyğun gəlmir; He and I hitch on well together Onunla mənimki çox düz gəlir / tutur*

**hitched** [hɪtʃt] *adj amer. jarq.* evli *(kişi və qadın haq.)*

**hitch-hike** ['hɪtʃhaɪk] *v* yol maşınları ilə pulsuz getmək
**hitch-hiker** ['hɪtʃ.haɪkə$^r$] *n* yol maşınları ilə pulsuz getməyi xoşlayan adam
**hither** ['hɪðə$^r$] *adv arx.* bura; ~ **and thither** ora-bura; irəli-geri, dala-qabağa; ~ **and yon(d)** müxtəlif istiqamətlərdə
**hithermost** ['hɪðəmoust] *adj arx.* ən yaxın
**hitherto** ['hɪðə'tu:] *adv arx.* bu vaxta qədər, indiyə kimi; **better than** ~ əvvəlkindən yaxşı; 2. *arx.* bu yerə qədər, bu vaxta kimi
**Hitlerism** ['hɪtlərɪzm] *n* hitlerizm
**Hitlerite**[1] ['hɪtləraɪt] *n* hitlerçi, alman faşisti
**Hitlerite**[2] ['hɪtləraɪt] *adj* hitler; ~ **Germany** hitler Almaniyası
**hive**[1] [haɪv] *n* 1. arı təknəsi/pətəyi/səbəti; 2. arı beçəsi; 3. *məc.* arı yuvası, yığın, dəstə; *This great hive, the city! Bu nəhəng arı yuvası (şəhər haq.)*; ~ **honey** şan balı
**hive**[2] [haɪv] *v* 1. arı ailəsini pətəyə salmaq/vurmaq; 2. *məc.* sığınacaq vermək; 3. beçə vermək, beçələmək; 4. bal toplamaq / tədarük etmək; **to ~ wisdom** ağıllanmaq, başına ağıl yığmaq; 5. bir pətəkdə yaşamaq *(arı haq.)*; 6. birgə, icma halında yaşamaq; 7.: **to ~ off/from** ayrılmaq, arı ailəsindən ayrılıb/parçalanıb ayrıca yeni ailə təşkil etmək; 8. ayırmaq; **to ~ off parts of the nationalized steel industry** milliləşdirilmiş polad sənayesinin bəzi hissələrini ayırıb müstəqil müəssisələr yaratmaq
**hive-bee** ['haɪvbi:] *n* = **honey-bee**
**hiver** ['haɪvə$^r$] *n* arıçı, arısaxlayan, arıxana işçisi
**hives** [haɪvz] *n tib.* örə, məxmərək *(xəstəlik)*
**ho** [hou] *int. (Təəccüb və heyranlıq ifadə edən nida)* Ey!; Aha!; Bıy! Bəh-bəh!; *What ho! Ey, bura bax!*
**hoar**[1] [hɔ:$^r$] *n* 1. qırov; 2. qatı duman; 3. ağ/ çal saç, ağarmış/çallaşmış saç; **the ~ of innumerable ages** uzaq keçmiş, çox qədim əyyam, çox qədim dövr
**hoar**[2] [hɔ:$^r$] *adj* 1. ağ, ağarmış, çal, dən düşmüş; **beard ~ with age** ağappaq/düm ağ/ qar kimi ağ saqqal *(pirani qocanın, rahibin, abidin və s.)*; 2. boz, bozumtul; ~ **cliffs** boz qayalar
**hoard**[1] [hɔ:d] *n* ehtiyat; məxfi ehtiyat, gizlədilmiş ehtiyat *(ərzaq, pul və s.)*; toplanılmış və gizlədilmiş hər hansı bir şey; xəzinə, dəfinə; **a miser's ~** xəsisin daxılı /küpəsi/bardağı *(pul yığaraq gizlətdiyi)*, xəsisin dəfinəsi; **a squirrel's ~ of nuts** dələnin fındıq ehtiyatı; **a ~ of gold coins** qızıl sikkə xəzinəsi; **a ~ of witty stories** tükənməz lətifələr xəzinəsi
**hoard**[2] [hɔ:d] *v (həm də* **to ~ up**) ehtiyat yığmaq/görmək; yığmaq, toplamaq, dala atmaq; **to ~ gold** qızıl yığmaq; **to ~ up treasure** xəzinə toplamaq / yığmaq; **to ~ food** ərzaq gizlətmək *(müharibə zamanı)*
**hoarding** ['hɔ:dɪŋ] *n* I 1. tikinti meydanının ətrafına çəkilən müvəqqəti hasar/çəpər; 2. elan / afişa yapışdırmaq üçün lövhə
**hoarding** ['hɔ:dɪŋ] *n* II 1. gizli ehtiyat toplama *(xüsusilə müharibə zamanı ərzaq ehtiyatı)*; 2. məxfi ehtiyat, xəzinə, dəfinə; **the ~s of a life-time** ömür boyu toplanmış yığım / ehtiyat
**hoar-frost** ['hɔ:'frɔst] *n* qırov
**hoarhead** ['hɔ:hed] *n* ağ/çal baş
**hoar-rime** ['hɔ:raɪm] *n* = **hoar-frost**
**hoarse** [hɔ:s] *adj* 1. xırıltılı, batıq, tutqun *(səs)*; **to talk oneself ~** səsi batana qədər danışmaq, danışmaqdan səsini batırmaq; *He shouted himself hoarse O, səsi batana qədər qışqırdı; I am hoarse Səsim batıb/ tutulub*; 2. kobud, qaba; gurultulu, uğultulu, qulaqbatırıcı; ~ **storm** uğultulu tufan / fırtına / boran; ~ **voice** kobud səs
**hoarsen** ['hɔ:sn] *v* səsi tutulmaq/boğulmaq, xırıldamaq, səsi batmaq/boğuqlaşmaq
**hoary** ['hɔ:rɪ] *adj* 1. ağ, çal, çallaşmış, dən düşmüş *(saç haq.)*; 2. qoca, ahıl; qocalıb əldən düşmüş; 3. qədim, çox köhnə; əsrlik, yüzillik; ~ **ruins** qədim xarabalar; ~ **prejudices** yüzillərlə kök salmış yanlış fikirlər
**hoax**[1] [houks] *n* mistifikasiya; aldatma, hiylə, kələk, fırıldaq
**hoax**[2] [houks] *v* aldatmaq, uydurmaq, başqasının sadəlövhlüyündən istifadə etmək; **to ~ *smb.* into believing or doing *smth.* foolish** bir kəsin sadəlövhlüyündən istifadə edərək onu axmaq bir iş görməyə inandırmaq
**hoaxer** ['houksə$^r$] *n* 1. mistifikasiyaçı, kələkbaz, hiyləbaz, hiyləgər; 2. yalançı/ şayiə yayan/ yalan şayiə buraxan adam
**hob**[1] [hɔb] *n* I buxarının yan tərəfində qazan qoymaq, xörəyi isti saxlamaq və ya çay qoymaq üçün düz / yastı ətək
**hob** [hɔb] *n*: II *Hob and nob, Hob a nob, Hob or nob! Şərəfinə!/Şərəfinizə!,Sənin /Sizin sağlığına!/sağlığınıza!*; **drink ~ a nob** badələri bir-birinə vurub birgə içmək
**hobble**[1] ['hɔbl] *n* 1. azca axsama, axsaya-axsaya yerimə; ayaqlarını sürüyə-sürüyə yerimə; 2. duruxa-duruxa danışma, duruxma, tutulma *(danışarkən)*; kələmə; 3. çidar *(at üçün)*; 4. *məc.* əsarət zənciri
**hobble**[2] ['hɔbl] *v* 1. azacıq axsamaq, axsaya-axsaya/ayaqlarını sürüyə-sürüyə yerimək; *The old man hobbled along with the aid of his stick Qoca kişi axsaya-axsaya əsasına dirənə-dirənə getdi;* 2. hıqqanmaq, dili dolaşmaq, dili tutulmaq, duruxa-duruxa danışmaq, dili topuq vurmaq; 3. çidarlamaq *(atı)*
**hobbledehoy** ['hɔbldɪ'hɔɪ] *n* yöndəmsiz / biçimsiz yeniyetmə/oğlan
**hobby** ['hɔbɪ] *n* I 1. hobbi, sevimli məşğuliyyət; *Gardening is his hobby Bağçılıq onun hobbisidir/sevimli məşğuliyyətidir; My hobbies are stamp-collecting and growing roses Mənim sevimli hobbim/ sevimli məşğuliyyətim marka toplamaq və qızılgül becərməkdir;* 2. oyuncaq at; 3. poni *(kiçikboylu at cinsi)*; 4. qədim velosiped



**hobby** ['hɔbɪ] *n* II *zool.* alacəhrə *(quş)*
**hobby-horse** ['hɔbɪhɔ:s] *n* 1. ucunda at kəlləsi olan oyuncaq çubuq at; at şəklində yellənçək/kaçalka; at şəklində minik yerləri olan karusel/fırlanğıc; 2. *arx.* təlxək, nədim; 3. *məc.* dil əzbəri, sevimli mövzu; *Now he's started on his hobby-horse İndi də o sevdiyi mövzu haqqında danışmağa başladı*
**hobgoblin** ['hɔb.gɔblɪn] *n* 1. damdabaca, şeytan balası; cin; 2. uyuq, qorxuluq
**hobnail** ['hɔbneɪl] *n* iribaşlı çəkmə mıxı
**hob-nob** ['hɔbnɔb] *v* bir yerdə/birlikdə içmək; bir-birinin şərəfinə/sağlığına içmək; ~ **with *smb.*** bir kəslə dostluq etmək /oturub-durmaq; *I used to hob-nob with the rich and famous Mən varlılar və tanınmış adamlarla oturub-durardım*
**hobo**[1] ['houbou] *n (pl* **-s, -es** [-z]) 1. *amer. d.d.* gəzərgi/səyyar fəhlə; təsadüfi qazancla/muzdla gününü keçirən işsiz fəhlə; 2. avara, səfil, sərsəri
**hobo**[2] ['houbou] *v* 1. gəzərək iş axtarmaq, bir yerdən başqa bir yerə gedərək iş axtarmaq; 2. səfil-sərgərdan gəzmək, sərsəri həyat keçirmək
**Hobson's choice** ['hɔbsnz'tʃɔɪs] *n* çeşidin olmaması, çeşidsiz seçib götürmə, məcburi seçmə
**hock**[1] [hɔk] *n* I reynveyn *(alman çaxırının bir növü)*
**hock** [hɔk] *n* II *anat.* diz vətəri, dizin arxa tərəfi; dal qıçın orta oynağı *(heyvanlarda)*
**hock** [hɔk] *n* III *amer. jarq.* girov; **in ~** girov qoyulmuş; həbsxanada; borc içində; çətin vəziyyətdə
**hock**[2] [hɔk] *v* I diz vətərini kəsmək
**hock** [hɔk] *v* II *amer. jarq.* girov qoymaq
**hockey** ['hɔkɪ] *n* hokkey *(idman növü)*; **field ~** ot üzərində oynanılan hokkey; **Canadian/ice ~** buz üzərində şayba ilə oynanılan hokkey; **ice ~ with ball** buz üzərində topla oynanılan hokkey; ~ **championship** hokkey birinciliyi/çempionatı
**hockey-player** ['hɔkɪ.pleɪə$^r$] *n* hokkeyçi, hokkey oyunçusu
**hockey-stick** ['hɔkɪstɪk] *n id.* hokkey ağacı
**hockey-team** ['hɔkɪti:m] *n* hokkey komandası
**hocus** ['houkəs] *n* 1. narkotik / uyuşdurucu maddə qatılmış spirtli içki; 2. *arx.* yalan, hiylə, kələk, fırıldaq; qəsdən təhrif etmə
**hocus-pocus**[1] ['houkəs'poukəs] *n* 1. fokus, hoqqa; 2. fokus-pokus, əl zirəkliyi; aldatma, kələk, gözdən pərdə asma
**hocus-pocus**[2] ['houkəs'poukəs] *v* 1. fokus göstərmək, hoqqa çıxartmaq; 2. aldatmaq, kələk gəlmək, gözdən pərdə asmaq; ələ salmaq, araya qoymaq
**hod** [hɔd] *n* 1. çiyində kərpic daşımaq üçün tabaq/qutu/teknə; əhəng/sement məhlulu üçün teknə; 2. kömür vedrəsi
**hodden** ['hɔdn] *n* 1. qaba yundan hazırlanmış parça *(ev şəraitində)*; 2. boyanmamış, öz təbii rəngində olan parça
**Hodge** [hɔdʒ] *n* muzdur, kəndli; kəndli-kütlü, avam/qaba adam;
◊ **Jolly Hodge** "Kefcil Rocer, dəniz qulduru bayrağı
**hodge-podge** ['hɔdʒpɔdʒ] *n istehz.* 1. həftbecər, hər şey, nə desən; **a ~ of tragedy and bathos** faciə / tragediya və məzənin qarışığı; 2. ət və tərəvəzdən hazırlanmış raqu
**hodiernal** [.houdɪ'ə:nəl] *adj* bugünkü, bu günə aid
**hodman** ['hɔdmən] *n* 1. *(pl* **-men** [-mən]) kərpic və palçıq daşıyan fəhlə, bənna köməkçisi; 2. *məc.* əlaltı, köməkçi; 3. günəmuzd işləyən ədəbi işçi
**hodometer** [hɔ'dɔmɪtə$^r$] *n* odometr *(keçilən yolu ölçən cihaz)*
**hoe**[1] [hou] *n* 1. toxa, kərki; qiyməkeş; 2. çalov *(ekskavatorun)*
**hoe**[2] [hou] *v* toxalamaq, kərkiləmək; yumşaltmaq *(torpağı)*; alaq otlarını vurmaq / təmizləmək; **to ~ up weeds** alaq otlarını təmizləmək/vurmaq
**hoe-cake** ['houkeɪk] *n amer.* qarğıdalı kökəsi
**hog**[1] [hɔg] *n* 1. axta donuz *(ətlik)*; **~'s bristle(s)** donuz qılı / tükü; 2. *amer.* donuz; 3. birillik donuz, çöl donuzu; *He is a hog at the table O, stolun başında özünü donuz kimi aparır*; 4. birinci qırxıma qədərki quzu; 5. birillik dana; 6.*d.d.* xudpəsənd / sırtıq / utanmaz / abırsız / ədəbsiz adam;
◊ **to play the ~** yalnız özü haqqında düşünmək; murdarlıq etmək; **to go ~ wild** özündən çıxmaq, qızmaq, cinlənmək; **to go the whole ~** işi sona çatdırmaq; bir şeyi əsaslı surətdə etmək; **independent as a ~ on ice** *amer.* özündən çox razı/ sırtıq/ədəbsiz adam; **on the ~** *jarq.* çox çətin vəziyyətdə /lüt/pulsuz olma
**hog**[2] [hɔg] *v* 1. belini qırmaq *(acgözlük edib götürə biləcəyindən çox götürmək)*; 2. əymək; bükmək; 3. əyilmək; bükülmək, qırılmaq; qabarmaq *(rütubətdən və s.)*; 4. murdarlıq etmək, donuz kimi hərəkət etmək; 5. *məc.* tez və səliqəsiz tıxmaq/aşırmaq/udmaq, donuz kimi/marçamarçla yemək; 6. mənimsəmək, mənqirləmək, zəbt etmək; tutmaq; **to ~ the road** yolu tutmaq /kəsmək, yol verməmək; **to ~ a seat** sərələnib oturmaq *(metroda və s.)*; 7. *k.t.* donuzları yemləmək; ~ **down /off** donuzları otarmaq
**hogback** ['hɔgbæk] *n* sıldırım dağ silsiləsi, yalçın sıra dağlar
**hog-backed** ['hɔg'bækt] *adj* qozbel; donqar; çox əyilmiş
**hog-cote**['hɔgkout] *n arx.* donuz pəyəsi/ damı
**hogflesh** ['hɔgfleʃ] *n* donuz əti
**hogget** ['hɔgɪt] *n* 1. birillik/bir yaşında qoyun; 2. *arx.* birillik erkək donuz/qaban
**hoggin** ['hɔgɪn] *n* iri qum; çınqıl; ələnti; kəpək
**hogging** ['hɔgɪŋ] *n* əyilmə, qabarma *(rütubətdən)*; əyrilik; əyri / əyilmiş yer
**hoggish** ['hɔgɪʃ] *adj* 1. donuzabənzər, donuzaoxşar; 2. donuz kimi, hisli-paslı, çirkli, murdar; 3. əclaf, nacins, nankor, alçaq, yaramaz; 4. xəsis, acgöz
**hog-grease** ['hɔggri:s] *n* ərinmiş donuz yağı / piyi

**hog-herd** ['hɔghə:d] *n arx.* donuzotaran
**hog-lamb** ['hɔglæm] *n* axta quzu
**hog-louse** ['hɔglaus] *n* donuz biti
**hog-pen** ['hɔgpen] *n* = **hog-cote**
**hogshead** ['hɔgzhed] *n* **1.** böyük çəllək; **2.** hoqzhed *(maye ölçüsü: 238.5 litrə yaxın)*
**hog-wash** ['hɔgwɔʃ] *n* **1.** horra *(donuz yemi)*, çirkab, qab suyu *(donuz üçün)*; **2.** *jarq.* boş çərənləmə; cəfəngiyyat, boş söz / şey
**hogweed** ['hɔgwi:d] *n bot.* ətirşah, ətirçiçəyi
**hoick¹** ['hɔik] *n* təkan; cəld hərəkət; dartma
**hoick²** ['hɔik] *v* **1.** *d.d.* yuxarı çəkmək; yuxarı qaldırmaq; **2.** yuxarı dartınmaq; tullanmaq; **3.** *av.* dik qalxmaq
**hoick³** ['hɔik] *int.* = **hoicks**
**hoicks** [hɔiks] *int. ovç. Tut! Qoyma! Al! (ovçuların itləri haylaması)*
**hoist¹** ['hɔist] *n* **1.** qaldırma; qaldırılma, qalxızma; **to give *smb.* a ~ 1)** bir kəsi dartıb qaldırmaq; **2)** *d.d.* bir kəsi mindirmək/ oturtmaq / əyləşdirmək; **2.** *tex.* qaldırıcı mexanizm/maşın/qurğu; bucurqad *(ağırlıq qaldıran mexanizm)*; **3.** *dən.* tali *(yükqaldıran mexanizm)*; **ammunition ~** mərmi elevatoru *(hərbi gəmilərdə)*; **4.** *dən.* bayraqla siqnal vermə; **5.** *jarq.* dükan oğrusu; **6.: the ~** dükanlarda/mağazalarda oğurluq; **~ lift** yükqaldıran lift
**hoist²** ['hɔist] *v* **1.** qaldırmaq *(yükü, bayrağı, yelkəni və s.; həm də* **to ~ up**); **to ~ colours** *dən.* bayraqları qaldırmaq; **to ~ together** *dən.* hamılıqla qaldırmaq; **to ~ oneself up** dırmaşmaq, dırmaşıb çıxmaq; **2.** *jarq.* dükan qarət etmək; *Hoist away!, Hoist away! dən. Hə! Qaldırdıq!*; **to ~ down** endirmək; **to ~ in** *dən.* gəmiyə qaldırmaq; *Hoist the boat in! Qayığı/Şlyupkanı qaldır!/qaldırın (gəmiyə)*; **to ~ out** suya salmaq; *Hoist the boat out! Qayığı/ Şlyupkanı suya sal!/salın!*
**hoist-bridge** ['hɔistbrɪdʒ] *n* qalxan/qaldırılan körpü
**hoisting** ['hɔistɪŋ] *n tex.* qaldırma *(yükü)*; **~ appliance/device** qaldırıcı mexanizm/ alət; **~ capacity** yükqaldırma qabiliyyəti; **~ jack** domkrat; **~ sling** *tex.* strop *(yük qaldırmaq və endirmək üçün ip / buraz)*
**hoit** ['hɔit] *v* **1.** səs-küylə əylənmək, şadyanalıq etmək; **2.** dəcəllik/nadinclik etmək, şuluq / şuluqluq salmaq
**hoity-toity¹** ['hɔɪtɪ'tɔɪtɪ] *n* **1.** səs-küy, qarışıqlıq, şuluqluq; **2.** dəmdəməkilik, yelbeyinlik, arsızlıq; **3.** dəcəl/şuluqçu/şıltaq qız
**hoity-toity²** ['hɔɪtɪ'tɔɪtɪ] *adj* **1.** lovğa, dikbaş, təkəbbürlü; **2.** dəymədüşər; tündməcaz
**hoity-toity³** ['hɔɪtɪ'tɔɪtɪ] *int. (Mənfi münasibət, narazılıq ifadə etmək üçün istifadə olunur); Yox canım!, Yox a!", Bəs nə oldu!, Allah-Allah!, Yox əşi!*
**hokey-pokey** ['houkɪ'poukɪ] *n* hoki-poki *(çəkilib qablaşdırılmış ucuz dondurma)*
**hokum** ['houkəm] *n amer. d.d.* **1.** həssaslıq, incəqəlblilik, nazikürəklilik; **2.** təsirli/riqqətli/ həyəcanlandırıcı mənzərə/səhnə; **3.** cəfəngiyyat, mənasız söz; **4.** yalan hiylə, fırıldaq
**hold¹** [hould] *n* I *dən.* anbar *(gəmidə)*; **after /forward /main ~** arxa /ön /əsas anbar *(gəmidə)*
**hold** [hould] *n* II **1.** saxlama, tutub saxlama; tutma; **to take/to get /to catch/to seize/to lay ~ of *smth.*** bir şeyi tutmaq/tutub saxlamaq; bir şeydən yapışmaq; *Catch hold of the rope! Kəndirdən yapış!/yapışın*; **to keep ~ of a thing** bir şeyi əldən buraxmamaq; **to let go /to leave /to lose /to release *one's* ~ of *smth.*** bir şeyi əldən buraxmaq; **to get ~ of a secret** sirri öyrənmək/ələ keçirmək; **to lose *one's* ~ on reality** həyatdan ayrı düşmək, reallıq hissini itirmək; **2. (~ on/over/upon)** təsir, ixtiyar, səlahiyyət, nüfuz, hökm; **to get ~ of *smb.*** bir kəsə öz nüfuzu ilə təsir göstərmək; *He has a great hold over his younger brother Onun kiçik/balaca qardaşının yanında böyük nüfuzu var*; **to keep a tight ~ upon oneself** özünü ələ almaq, özünü saxlaya bilmək; *His wife has a firm hold over him Arvadı onu əlində bərk saxlayır, Arvadının onun üstündə böyük hökmü var;* **3.** tutmaq / yapışmaq üçün mümkün olan hər hansı bir şey; dayaq, götürüm, qulp, dəlik və s.; **4.** bir şey saxlanılan yer, anbar; **5.** həbsxana; həbsxana hücrəsi; **6.** daldalanacaq, sığınacaq; **7.** *mus.* fermata *(çalarkən və ya oxuyarkən səsin və ya pauzanın uzadılması)*;
◊ **to keep a good ~ of the land** *dən.* sahil boyu üzmək, sahildən uzaqlaşmadan üzmək
**hold²** [hould] *v (pt, pp* **held** [held]) **1.** tutmaq; **to ~ a pen** qələm tutmaq; *The girl was holding her father's hand Qız atasının əlindən tutmuşdu*; **to ~ fast to *smth.*** bir şeydən bərk-bərk tutmaq; *The wounded man was holding fast to the railings Yaralı məhəccərdən bərk-bərk tutmuşdu; He held his sides with laughter O, gülməkdən böyürlərini tutdu*; **2.** saxlamaq, tutub saxlamaq; qoymamaq; yubatmaq, ləngitmək; *The driver could scarcely hold the horses Faytonçu atları güclə saxlaya bildi*; **to ~ *one's* breath** nəfəsini saxlamaq, nəfəs almamaq, nəfəsini dayandırmaq; **to ~ fire** *hərb.* atəşi dayandırmaq; *Will they hold (up) the bus till we get there? Biz ora çatana qədər onlar avtobusu ləngidəcəklərmi?; We were held (up) by the traffic Küçə hərəkəti bizi ləngitdi*; **3.** sahib/malik olmaq; sahibi olmaq, yiyəlik etmək; **to ~ land** torpaq sahibi olmaq; *The grandson now holds the estate and the title İndi mülk də, rütbə də nəvəyə keçdi*; **4.** mühafizə etmək, qorumaq; nəzarəti saxlamaq *(bir şey üzərində)*; dəf etmək; *They held the fort against all attacks Bütün hücumları dəf edərək onlar istehkamı əldə saxladılar*; **to ~ in check** dayandırmaq, qabağını almaq; *They held the enemy in position Onlar düşməni yaxınlaşmağa qoymadılar*; **5.** tutmaq, yerləşdirmək; yerləşmək; var olmaq; *This room holds a hundred persons Bu otaq yüz adam tutur; The box holds all his securities Onun bütün qiymətli kağızları bu mücrüdədir; Will this suitcase hold all your clothes? Bu çamadan sənin/ sizin bütün paltarlarını/ paltarlarınızı tutacaqmı?; He eats as much as he can hold O, qarnı tutunca yeyir; The barrel holds 25 litres Bu çəllək 25 litr tutur; Sea-water holds many salts in solution Dəniz suyunda həll olmuş halda çoxlu duzlar var*; **6.** hesab/ güman/zənn etmək, sanmaq; *I hold it good Mən hesab edirəm ki, bu yaxşıdır; I hold him to be wrong Güman edirəm ki, o yanılır; He doesn't hold himself responsible for his wife's debts O, arvadının borcları üçün özünü cavabdeh hesab etmir; She holds Tom to be a fool O, Tomu axmaq hesab edir; The President is not held in great respect Prezidenti böyük hörmət sahibi hesab etmirlər; Plato held that the soul is immortal Platon ruhu əbədi sanırdı; The judge held that he was guilty Hakim onu müqəssir hesab etdi*; **7.** dustaq/həbs etmək, həbsxanada saxlamaq; *He was held 36 days O, 36 gün həbsxanada saxlanıldı*; **8.** davam/tab gətirmək, dözmək; *Will the rope hold? Bu kəndir davam gətirəcəkmi?; The dam gave way; it was not strong enough to hold the flood waters Bənd davam gətirməyib uçdu, O, daşqın sularına tab/davam gətirəcək qədər möhkəm deyildi;* **9.** davam etmək, olmaq *(hava haq.)*; *The fair weather is holding Açıq/Gözəl hava davam etməkdədir; If the frost holds we shall have skating tomorrow Əgər şaxta davam etsə, sabah konkidə sürüşəcəyik*; **10.** qüvvədə qalmaq/olmaq *(qanun, vəd və s. haq.)*; *The promise still holds Vəd hələ də qüvvədə qalır; Does the principle still hold good? Bu qanun/ qayda hələ də qüvvədə qalırmı?*; **11.** vəzifə tutmaq, hakimiyyətdə olmaq; *He holds two offices at the same time O, eyni vaxtda iki vəzifə tutur; The Liberals held office at that time Liberallar o zaman hakimiyyətdə idilər*; **12.** cəlb etmək; hakim kəsilmək; **to ~ the attention of *one's* audience** dinləyicilərin diqqətini özünə cəlb etmək; *He held the guests with his story O öz hekayəsilə qonaqların diqqətini cəlb etdi*; **13.** keçirmək; təşkil etmək; aparmaq *(danışıq)*; düzəltmək; **to ~ a meeting** iclas keçirmək; *The election was held in November Seçki noyabrda keçirildi*; **to ~ a discussion** müzakirə aparmaq; **to ~ negotiations** danışıqlar aparmaq; **to ~ a press conference** mətbuat konfransı təşkil etmək/keçirmək; **to ~ a feast** yemək-içmək təşkil etmək, ziyafət / qonaqlıq vermək; *The college will hold classes to-day Bu gün kollecdə dərs keçiriləcək*; **14.** qorumaq, yadda saxlamaq; *I cannot hold all these details in my head / memory Mən bütün bu təfsilatları başımda / yadımda saxlaya bilmərəm; Hold the traditions which you have been taught Sənə/Sizə aşılanmış / öyrədilmiş adət-ənənələri qoruyub saxla/ saxlayın*; **15.** qeyd etmək *(yubileyi və s.)*, bayram etmək/keçirmək; *When is the anniversary to be held? İldönümü nə vaxt qeyd olunacaq?*; **16.** buraxmamaq *(mayeni)*; su keçirməmək; *A leather bag will hold water but not petrol Dağarcıq suyu saxlayar, ancaq benzini yox*; **to ~ *smb./smth.* in a position** bir kəsi/şeyi hər hansı bir vəziyyətdə saxlamaq / tutmaq; **to ~ *one's* head straight** başını düz tutmaq; *Hold your head on one side Başını/Başınızı bir tərəfə döndər/döndərin; Hold your head up! Başını/Başınızı qaldır/qaldırın!, Başını/Başınızı dik tut!/tutun!*; **to ~ oneself upright/erect** düz dayanmaq; *He holds himself like a soldier O özünü əsgər kimi aparır; Hold yourself still! Tərpənmə!/ Tərpənməyin!*; **to ~ back 1)** dayandırmaq, qabağını almaq; tutmaq, tutub saxlamaq; *They held back the enemy Onlar düşmənin qabağını aldılar; Do they hold back a portion of wages for insurance Əməkhaqqından sığorta haqqı tuturlarmı?*; **2)** tərəddüd etmək, ləngimək; özünü kənara çəkmək; boyun qaçırmaq; *When danger came, no one held back Təhlükə baş verəndə heç kəs özünü kənara çəkmədi; Buyers are holding back Alıcılar tərəddüd edirlər*; **3.** gizlətmək, gizlində saxlamaq, ört-basdır etmək; **to ~ back information** məlumatı gizlətmək; **to ~ back the truth** həqiqəti ört-basdır etmək; **to ~ down 1)** qalxmağa /yaxa qurtarmağa/zorla çıxmağa qoymamaq; *I held the ruffian down while they bound him Onlar dələduzun əl-qolunu bağlayana qədər mən onu qalxmağa qoymadım; Hold that dog down; he is dangerous O köpəyi buraxma/buraxmayın, o, qorxuludur; We must hold prices down Biz qiymətləri qalxmağa qoymamalıyıq*; **2)** istismar etmək, əsarət altında saxlamaq; **rulers who ~ down the people** xalqı əsarətdə saxlayan hakimlər; **to ~ down a job** vəzifəni saxlamaq, yeri itirməmək; **to ~ forth 1)** təmtəraqlı danışmaq; boşboğazlıq /lağlağılıq / naqqallıq etmək; **2)** uzatmaq; təklif etmək; *He held forth the note O, məktubu /kağızı göstərdi/irəli uzatdı*; **to ~ forth a hope** ümid vermək; **to ~ in** özünü saxlamaq; susmaq; **to ~ in *one's* temper** hirsini saxlamaq, özündən çıxmamaq; **to ~ oneself in** özünü ələ almaq; *He wanted to speak but thought better of it and held in O danışmaq istəyirdi, ancaq fikrini dəyişdi/özünü saxladı*; **to ~ off 1)** bir qədər uzaqda/aralıda saxlamaq/tutmaq; *Hold that dog off! İti bir az uzaqda saxla!/ saxlayın!; His cold manner holds people off Onun soyuqluğu camaatı ondan uzaqlaşdırır*; **2)** ləngimək, yaxınlaşmamaq, gəlməmək; *The storm held off Tufan bizi tutmadı; Will the rain hold off until the evening? Ola bilərmi ki, axşama qədər yağış yağmasın?; Hold off for a minute Bir dəqiqəlik əl saxla/saxlayın*; **to ~ on 1)** tutmaq, yapışmaq; dayanmaq; gözləmək; *The boy held on to*

*the bush until someone climbed down the cliff to rescue him Bir nəfər sıldırım qayadan enib onu xilas edənə qədər oğlan koldan tutub gözlədi; Hold on a minute! Bir dəqiqə dayan!/dayanın!*; 2) yerində saxlamaq; *These bolts and nuts hold the wheel on Bu boltlar və qaykalar təkərləri saxlayır*; **to ~ out** 1) müqavimət göstərmək, qabağında dura/dayana bilmək; *How long can we hold out against these attacks? Bu hücumlara biz nə qədər davam gətirə biləcəyik?*; 2) kifayət etmək, çatmaq; *How long will our food supplies hold out Bizim ərzaq ehtiyatımız nə vaxta qədər çatar?*; 3) saxlamaq, dözmək; *I can't hold out much longer - I must find a toilet Daha dözə bilmirəm/sidiyimi saxlaya bilmirəm - mən tualet tapmalıyam*; 4) ümid bəsləmək, söz vermək; *The doctors hold out little hope for his recovery Həkimlər onun sağalacağına az ümid bəsləyirlər*; **to ~ over** 1) təxirə salmaq, yubatmaq, gecikdirmək; *The matter was held over until the next week Məsələ gələn həftəyə qədər təxirə salındı*; 2) kənara / bir yana qoymaq, saxlamaq *(ehtiyat kimi)*; *Hold over the rest of the goods Malın qalan hissəsini bir yana qoy/qoyun*; **to ~ together** 1) bəndləmək, bitişdirmək, bağlamaq; **to ~ papers together** sənədləri bəndləmək; *Love of country holds the nation together Vətən eşqi/məhəbbəti xalqı birləşdirir*; 2) birlikdə/bərabər /yekdil/həmrəy olmaq; *We cannot be defeated while we hold together Nə qədər ki, biz birlikdəyik, bizi məğlub etmək olmaz*; 3) bütöv olmaq; *The bodywork of this old car hardly holds together Bu köhnə maşının gövdəsi güclə dayanır. Bu köhnə maşının gövdəsi lap tökülür*; **to ~ up** 1) göstərmək, nümayiş etdirmək; *Don't hold me up as a model husband Məni nümunəvi ər kimi misal göstərmə / göstərməyin*; **to ~ *smth.* up to view** bir şeyi nümayiş etdirmək; 2) yubatmaq, ləngitmək, gecikdirmək; *They were held up by fog Onları duman ləngitdi; The traffic was held up by fog Dumana görə küçə hərəkəti ləngimişdi*; 3) soyğunçuluq məqsədilə saxlamaq, qarət etmək; qabağını kəsmək; *The travellers were held up by bandits Quldurlar səyahətçilərin qabağını kəsdilər*;

◊ **to ~ *one's* hand** əl saxlamaq, gözləmə mövqeyi tutmaq; **to ~ hand** əl vermək, kömək etmək; *Hold hard, Hold on! Gözlə!/Gözləyin!*; **to ~ on like grim death** son nəfəsə qədər qorumaq, möhkəm dayanmaq; **to ~ water** tənqidə dözmək; əsaslı/məntiqi / inandırıcı olmaq; *It won't hold water Bu, tənqidə layiq deyil, Bunu tənqid etməyə dəyməz, Bu heç bir şeyə yaramaz; Your arguments doesn't hold water Sizin dəlilləriniz inandırıcı deyil, onların əsası / məntiqi yoxdur*; **to ~ *one's* ground** möhkəm dayanmaq, geri çəkilməmək; *Our soldiers held their ground bravely Əsgərlərimiz cəsarətlə dayanıb geri çəkilmədilər*; **to ~ *one's* own** öz ləyaqətini / mövqeyini qorumaq; özünü itirməmək; davam gətirmək, müqavimət göstərmək; *The patient is still holding his own Xəstə hələ də davam gətirir; Mr. Green held his own Cənab Qrin öz mövqeyini qorudu (mübahisədə); Hold your horses! Özündən/Özünüzdən çıxma!/çıxmayın! Danışığına/Danışığınıza fikir ver!/verin!*; **to ~ *one's* tongue** dilini (ağzında) saxlamaq

**hold-all** ['houldɔ:l] *n* 1. portpled; məfrəş; 2. sumka, qutu *(alət saxlamaq/yığmaq üçün)*

**holder** ['houldə^r] *n* 1. icarədar, icarəyə götürən; 2. sahib, sahibkar; təqdim edən, göstərən; **~ in due course** tam hüquqlu sahibkar; **~ of pledges** girov alan, girova pul verən adam; 3. priz alan / almış *(yarış iştirakçısı)*; rütbə sahibi; 4. dəstək, tutacaq; 5. *tex.* qazholder *(qaz anbarı)*; 6. *anat.* köpək dişi; 7. *zool.* tutucu / qapıçı / qarmalayıcı orqanlar/üzvlər

**-holder** ['-houldə^r] *mürəkkəb ismin komponenti kimi*: cigarette-**holder** müştük/çubuq; office-**holder** vəzifə sahibi; kettle-**holder** çaydan tutacağı *(parçadan tikilmiş)*; share-**holder** pay sahibi

**hold-fast** ['houldfa:st] *n* 1. dayaq, dirək, söykənəcək; isnad; 2. dəmir bənd, çənbər, pərçim; 3. qulp, dəstə; 4. yapışma, tutma

**holding** ['houldıŋ] *n* 1. torpaq sahəsi *(xüs. icarəyə götürülmüş)*; **small ~s** həyətyanı sahələr; 2. *hüq.* əmlak *(xüs. icarəyə götürülmüş daşınmaz əmlak)*; 3. *mal.* əmanət; **cash ~s in banks** bankda olan nəqd pul; 4. ehtiyat; 5. sakit olma; özünü saxlama; kirimə, kəsilmə, tutulma; sakitləşdirmə; götürmə; *There is no holding that fellow Oğlanı heç cür sakitləşdirmək olmur*; **~ of breath** nəfəsi saxlama; **~ of hostage** girov götürmə

**holding company** ['houldıŋ'kʌmpənı] *n* təsisçi şirkət; başqa şirkətlərin nəzarət səhm paketini özündə saxlayan şirkət

**holdover** ['houldouvə^r] *n amer.* 1. keçmişin qalığı, keçmişdən qalmış miras; 2. təkrar seçilmiş şəxs; **~ Senator** təkrar seçilmiş senator; 3. istintaq altında olanlar üçün həbsxana, ibtidai/ilkin istintaq və ya ilkin həbs zamanı müttəhimlərin saxlandığı həbsxana; 4. həbs müddətinin uzadılması

**hold-up** ['houldʌp] *n* 1. basqın, silahlı basqın, soyğunçuluq, qarətçilik, quldurluq, çapovulçuluq; 2. hərəkətin dayanması, basırıq, tıxac *(hərəkətdə)*; 3. *amer.* zorakılıq, şantaj, hədələməklə, fırıldaqla alma/ qoparma *(pul və s.)*; günün günorta vaxtı soyğunçuluq

**hold-up man** ['houldʌp'mæn] *n* quldur, silahlı quldur, soyğunçu, qarətçi

**hole[1]** [houl] *n* 1. deşik, dəlik, göz; **a ~ in a roof** damda deşik; **a ~ in *one's* clothes** paltarda deşik; **to wear *one's* socks into ~** corab deşilənə qədər geymək; 2. yarıq; baca; **a ~ in the fence** çəpərdə yarıq; 3. çala, çuxur; oyuq, koğuş; **a ~**



**in a tooth** dişdə koğuş/oyuq; **roads full of ~s** çala-çuxurla dolu yollar; 4. yuva, yataq, deşik; **a mouse's ~** siçan yuvası/deşiyi; **the ~ of a fox** tülkü yuvası; 5. *məc.* daxma, koma, hin; *What a wretched little hole! Nə miskin balaca bir koma!*; 6. ucqar yer, daldalanacaq; 7. *d.d.* çətin/çıxılmaz vəziyyət *(məc. maliyyə çətinliyi)*; **to be in a ~** 1) çətin vəziyyətdə olmaq; *He is in a hole O, çətin vəziyyətdədir;* 2) *amer.* borclu olmaq; *I am fifty dollars in the hole this month Bu ay mən əlli dollar borc almışam*; 8. nöqsan, qüsur, eyib, nöqsanlı cəhət; **to find ~s in the argument** mühakimədə nöqsanlı cəhətlər tapmaq/ hiss etmək; 9. çayın dərin yeri, nohur, gölcük; buxta, kiçik körfəz; **swimming ~** çayın çimmək üçün yararlı yeri; 10. *av.* hava boşluğu; 11. həbsxana kamerası; 12. bombanın açdığı çuxur /çala; 13. qovuq/ boşluq *(tökmə metalda)*; 14. *k.t.* çuxur, çala; 15. göz, dəlik *(pendirdə)*; 16. çala *(qolf oyununda)*; 17. şurf *(mədən yataqları axtarmaq üçün qazılan quyu)*; 18. şpur *(əridici peçlərdə maye axıtmaq üçün dəlik)*;

◊ **a ~ in *one's* coat** adında ləkə; **like a rat in a ~** divara dirənmiş, çıxılmaz vəziyyətdə; **to make a ~ in *smth.*** boşaltmaq *(cibi və s.)*, axırına çıxmaq *(ehtiyatın və s.)*, böyük məbləğ sərf etmək; *The hospital bills made a large hole in his savings Onun əmanətinin xeyli hissəsi xəstəxana xərclərini ödəməyə sərf olundu; Money burns a hole in his pocket Pul onun cibini deşir, O, pul saxlayan deyil;* **to make a ~ in the water** özünü suda boğmaq; suda boğulmaq; **to find a ~** çıxış yolu tapmaq

**hole[2]** [houl] *v* 1. deşmək, deşik açmaq, dəlmək; deşib keçmək; *The ship has holed her bottom Gəminin altında deşik əmələ gəlib, Gəminin altı deşilib*; 2. qazmaq; açmaq *(tunel)*; *They holed a tunnel through the mountain Onlar dağın altından tunel açdılar*; 3. yuvaya girmək/soxulmaq; *The fox has holed Tülkü yuvaya girib*; 4. qovmaq, salmaq *(yuvaya)*; 5. *arx.* həbsxanaya/qoduqluğa salmaq; 6. qazmaq *(quyu)*

**hole-and-corner** ['houlnd'kɔ:nə^r] *adj* gizli, məxfi, oğrun-oğrun edilən; *(söhbət haq.)*; *We don't like these hole-and-corner methods Biz gizli üsulları xoşlamırıq*; **~ dealings** şübhəli işlər; **~ deal** səhnə arxası/ gizli sövdələşmə

**holer** ['houlə^r] *n* qazmaçı, buruq fəhləsi

**holiday** ['hɔlədı, 'hɔlədeı] *n* 1. bayram, istirahət günü; *Sunday is a (legal) holiday in most countries Bazar günü əksər ölkələrdə istirahət günüdür; Friday is a holiday in most Muslim countries Cümə günü əksər islam ölkələrində istirahət günüdür;* 2. *pl* məzuniyyət, tətil; **summer ~s** yay tətili; **on (a) ~** məzuniyyətdə; **to be away on ~** məzuniyyətə getmək; tətilə çıxmaq; **to take a month's ~** bir aylıq məzuniyyət götürmək; *Our typist is away on holidays Makinaçımız məzuniyyətdədir*; 3. istirahət, əyləncə; **to make ~** əylənmək, kef çəkmək, dilxoşluq etmək

**holiday-maker** ['hɔlədı͵meıkə^r] *n* 1. istirahət edən/ əylənən şəxs; 2. məzuniyyətçi, məzuniyyətdə olan / məzuniyyətə gedən / kurortda istirahət və müalicə alan şəxs; 3. turist, ekskursant, ekskursiyaçı

**holiness** ['houlınıs] *n* 1. müqəddəslik, qüdsiyyət; 2. dindarlıq, möminlik, zahidlik; 3. Zati-müqəddəsləri *(titullu papalara müraciət)*; **Your Holiness** Zati müqəddəsləri

**holler** ['hɔlə^r] *v d.d.* qışqırmaq, çığırmaq, bağırmaq, fəryad/fəğan etmək; *Stop hollering – nobody is going to hurt you! Fəryad etmə/etməyin – heç kəs səni/sizi incitməyəcək*

**hollo[1]** ['hɔlou] *int.* 1. Ey!; Aha!, Oho!; 2. *Çox gözəl!, Çox yaxşı!, Çox pakizə!*

**hollo[2]** ['hɔlou] *v* 1. səsləmək, çağırmaq; 2. iti səsləmək, çağırmaq; 3. *ovç.* saldırmaq, qısqırtmaq, haylamaq *(iti ovun üstünə)*

**holloa** ['hɔlou] *n* = **hollo[1,2]**

**hollow[1]** ['hɔlou] *n* 1. boşluq; 2. çuxur, çala, çökək, oyuq, batıq; təkər izi / yeri, oyum *(yolda təkərin əmələ gətirdiyi çala-çuxur)*; **wave ~** dalğanın dibi/ətəyi; 3. dayaz dərə; 4. oyuq, koğuş; 5. mağara, kaha, zağa

**hollow[2]** ['hɔlou] *adj* 1. boş, içiboş, oyuq; **a ~ ball** içiboş şar/top; **a ~ tree** koğuş ağac; **a ~ tooth** içioyuq/çürük diş; **~ concrete** içiboş gövdəli beton; 2. batıq, çuxura düşmüş, çökək; **~ cheeks** batıq/çuxura düşmüş ovurd; **~ eyes** çuxura düşmüş gözlər; **~ temples** çuxur/çuxura düşmüş gicgahlar; **~ faces** üzgün/batıq sifətlər; 3. ac, boş *(qarın)*; **to feel ~** acımaq, aclıq hiss etmək; 4. küt, boğuq *(səs)*; **~ roar** boğuq gurultu; 5. əhəmiyyətsiz, yüngül, səthi, boş, ciddiyyətsiz; **~ words** boş sözlər; **~ promises** boş vədlər; **~ laugh** boş/yüngül gülüş; **~ joys and pleasures** ötəri / boş sevinc və nəşələr; **~ reasoning** səthi mühakimə/düşüncə

**hollow[3]** ['hɔlou] *adv d.d.* tamamilə, bütövlüklə, tamam-kamal, axıra qədər; **to beat (all) ~** büsbütün darmadağın etmək; külünü göyə sovurmaq; 2. böyük hesabla qalib gəlmək *(idman yarışında)*

**hollow[4]** ['hɔlou] *v (həm də* **to ~ out**) 1. oymaq, deşmək, qayırmaq, düzəltmək *(dəlmə, oyma üsulu ilə)*, oyub/qazıb çıxarmaq; *He hollowed out a tree for a boat O, ağacı oyub qayıq düzəltdi*; 2. çuxura salmaq, içəri əymək, əymək; oyub aparmaq, oymaq, altdan oymaq; *River banks were hollowed out by rushing water Şiddətli axan su çayın sahilini yuyub/oyub apardı*; **to ~ out the back** belini əymək *(gimnastika)*; 3. boşalmaq, içi boşalmaq/oyulmaq

**hollow-cheeked** ['hɔlou'tʃi:kt] *adj* ovurdları batmış/çuxura düşmüş, batıq ovurdlu

**hollow-eyed** ['hɔlouaıd] *adj* batıq gözlü, gözləri çuxura düşmüş

**hollow-hearted** ['hɔlou'ha:tɪd] *adj* daşürəkli, hiyləgər, qeyri-səmimi, ikiüzlü, kələkbaz
**hollowness** ['hɔlounɪs] *n* 1. boşluq; 2. boğuqluq, boğuq səs /ton; 3. qeyri-səmimilik, ikiüzlülük, hiyləgərlik, daşürəklilik
**hollow-ware** ['hɔlouweəʳ] *n* dərin qab-qacaq *(kasa, qazan, bardaq və s.)*
**holly** ['hɔlɪ] *n bot.* pirkal *(həmişəyaşıl kol bitkisi)*
**holly-hock** ['hɔlɪhɔk] *n bot.* gülxətmi, xətmi
**holly-oak** ['hɔlɪouk] *n bot.* həmişəyaşıl palıd ağacı
**Hollywood** ['hɔlɪwud] *n* Hollivud, Amerika kinematoqrafiyası, Amerika kino sənayesi; *This is pure Hollywood Bu, əsl / sırf Hollivud filmidir (kommersiya və sensasiya filmləri haq.)*; ~ **films** Hollivud filmləri; ~ **stars** Hollivud ulduzları/tanınmış aktyorları; ~ **bed** bir söykənəcəkli enli çarpayı
**holm** [houm] *n* = **holm-oak**
**holm-oak** ['houm'ouk] *n* = **holly-oak**
**holocaust** ['hɔləkɔ:st] *n* 1. odda/alovda məhv/həlak olma *(xüs. insan haq.)*; 2. qırğın, qırhaqır, dağıdıcı müharibə; **a nuclear** ~ nüvə silahı ilə məhv etmə/qırma; 3. qurbanı yandırma ayini *(qədim xalqlarda)*
**Holstein** ['hɔlstaɪn] *n k.t.* holştin cinsi *(mal-qara haq.)*
**holster** ['houlstəʳ] *n* 1. *hərb.* qobur *(tapança qabı)*; 2. özül *(maşında, dəzgahda)*, dəzgah çatısı
**holus-bolus** ['houləs'bouləs] *adv* 1. *d.d.* əlüstü, bir anda / içimə, hamı bir yerdə; 2. topdan, qalama, qabsız; çeşidləmədən
**holy** ['houlɪ] *adj* müqəddəs, pak, qüdsi, qutsal, əqdəs, ülvi; **the Holy Bible** müqəddəs Bibliya *(Tövrat və İncil)*; **the Holy Writ** = **the Holy Bible**; **The Holy City** Qüds şəhəri *(Yerusəlim)*; **the Holy Koran** müqəddəs Quran; **the Holy Week** pasxa bayramından əvvəlki həftə; **the Holy Father** müqəddəs Papa *(katolik kilsəsinin başçısı)*; **the Holy office** inkvizisiyanın rəsmi adı *(katolik kilsəsinin XIII əsrin əvvəlində təşkil etdiyi məhkəmə - polis təşkilatı)*; ~ **water** qutsal/ müqəddəs su, zəmzəm; ~ **war** müqəddəs müharibə, cihad; ~ **love** ülvi məhəbbət; **a** ~ **man** mömin / dindar/zahid; **a** ~ **terror** 1) heybətli/qorxulu adam; küpəgirən qarı; 2) qatı pedant, son dərəcə vasvası adam; 3) çox pis uşaq, allahın bəlası
**holy-stone** ['houlɪstoun] *n* süngər daşı, pemza
**holystone** ['houlɪstoun] *v* gəminin göyərtəsini süngər daşı ilə təmizləmək
**homage** ['hɔmɪdʒ] *n* 1. hörmət, ehtiram, sitayiş, pərəstiş; **to do/to pay/to render** ~ 1) ehtiramını izhar etmək, hörmətini bildirmək; 2) haqq vermək/qazandırmaq; baş əymək; *We pay homage to the genius of Hussein Cavid Biz Hüseyn Cavid dühası qarşısında baş əyirik; Many came to do the dead man homage Mərhuma son borcunu vermək üçün çox adam gəlmişdi;* **to drink in** ~ təriflərdən /mədhlərdən məst olmaq /həzz almaq/nəşələnmək; 2. *arx.* feodalın öz vassal öhdəliyini camaat qarşısında rəsmən qəbul etməsi; 3. *tar.* vergi, baş vergisi, bac, xərac; **to perform** ~ *tar.* can(la)-başla/sədaqətlə qulluq etmək *(krala, feodala və s.)*
**homager** ['hɔmɪdʒəʳ] *n tar.* vassal; təbəə; rəiyyət
**home**[1] [houm] *n* 1. ev, mənzil, məskən; yurd; **at** ~ evdə; **hamlet of fifty** ~**s** əlli evdən ibarət kənd; 2. daimi yaşayış yeri, olduğu yer; yaşama; **to make** *one's* ~ **in the country** kənddə yaşamaq / məskən salmaq / məskunlaşmaq; köçüb oturmaq; *When I retire I shall make my home in the country Təqaüdə çıxanda köçüb oturacağam kənddə;* **to give** *smb.* **a** ~, **to make a** ~ **for** *smb.* bir kəsi sığındırmaq / saxlamaq, bir kəsə sığınacaq vermək; *A friend offered me a home with him Dostlarımdan biri mənə köçüb onun evində yaşamağı təklif etdi;* 3. ata evi/ocağı, ata / ana yurdu, doğma diyar; *He left home at the age of 16 O, 16 yaşında ata ocağını tərk etdi (sərbəst, müstəqil yaşamağa başladı); He looks forward to seeing the old home again O səbirsizliklə doğulduğu ata yurdunu görməyi gözləyir; He was born in England, but he now looks on Paris as his home O, İngiltərədə anadan olub, ancaq indi o, Parisə doğma yurd kimi baxır (Parisi doğma yurd hesab edir);* 4. vətən, yurd; **to return to** *one's* ~ vətəninə/doğma yurduna qayıtmaq; *He left India for home O, Hindistanı tərk edib vətəninə yola düşdü;* **to fight for** ~ **and country** vətən uğrunda vuruşmaq; 5. ailə, ailə həyatı, öz ailəsi; *Hers was a happy home Onun ailə həyatı xoşbəxt idi; The war brought sorrow to many homes Müharibə çox ailəyə bədbəxtlik gətirdi;* 6. areal, yayılma sahəsi; vətəni *(bitkilərin, heyvanların); The Indian jungle is the home of the tiger Hindistan cəngəlliklərı pələnglərin vətənidir;* 7. *məc.* beşik, vətən, yaranma yeri; *England is the home of railways İngiltərə dəmiryolunun beşiyidir /vətənidir;* 8. öz meydançası; **at** ~ *id.* öz meydançasında;
◊ *one's* **last/long** ~ qəbir, qəbir evi, gor, gor evi; **a** ~ **away from** ~ ikinci ev, bir ev aralı; **to be at** ~ özünü rahat/sərbəst/evdəki kimi hiss etmək; *The boy was not quite at home there Oğlan özünü orada çox da rahat hiss etmirdi; Make yourself at home Özünü / Özünüzü öz evindəki / evinizdəki kimi hiss et / edin;* **not at** ~ **to** (qonaq) qəbul etməmək; *Mrs Hill is not at home to anyone except relatives Xanım Hill öz qohumlarından başqa heç kəsi qəbul etmir;* **to feel at** ~ = **to be at** ~; **to be / to feel at** ~ **in / with** *smth.* bir şeyi yaxşı bilmək /dərindən mənimsəmək; *He feels at home in / with English O, ingilis dilini yaxşı bilir; Is it difficult to feel at home in a foreign language? Xarici dildə sərbəst danışmaq çətindirmi?; Go home and say your prayers! Get /Gedin işinlə /işinizlə məşğul ol! /olun!; Başqasının işinə burnunu/burnunuzu soxma!/soxmayın!; East or West home is best, There is no place like home at. söz.* ≅ *Gəzməyə qərib ölkə, ölməyə vətən yaxşı, Gəzdim aran-turanı, cənnət gördüm buranı*
**home**[2] [houm] *adj* 1. ev, evə məxsus; ~ **science** evdarlıq; ~ **treatment** evdə müalicə, ev müalicəsi; ~ **work** ev tapşırığı; ~ **baked** evdə bişirilmiş; ~ **baking** ev şəraitində bişirmə; ~ **slaughtering** evdə mal kəsmə; ~ **life** ailə həyatı; ~ **joys** ailə sevinci; 2. doğma, öz, özününkü; ~ **town** doğma şəhər; ~ **base** *av.* öz təyyarə bazası/meydanı; ~ **station** *d.y.* qeydiyyat stansiyası; 3. yerli; ~ **team** *id.* yerli komanda, meydança sahibi; ~ **industry** yerli sənaye; ~ **manufacture** yerli istehsal; 4. daxili; ~ **market** daxili bazar; ~ **trade** daxili ticarət; **Home Office** Daxili İşlər Nazirliyi; **Home Secretary** Daxili İşlər Naziri; 5. metropoliya, metropoliyaya məxsus; ~ **(air) defence** metropoliyanın /ölkənin müdafiəsi *(hava hücumundan)*; ~ **service** *hərb.* metropoliyada hərbi xidmət; ~ **defence** metropoliyanın müdafiəsi; **Home Fleet** metropoliya donanması; ~ **forces** metropoliyaya məxsus daxili qoşunlar; **Home Guard** yerli müdafiə qoşunları;
◊ **Home Counties** Londonətrafı qraflıqlar
**home**[3] [houm] *adv* 1. evdə; **to be** ~ evdə olmaq; 2. evə; **on** *one's* **way** ~ evə gedərkən yolda; **to go** ~ evə getmək; **to come** ~ evə gəlmək; **to see** *smb.* ~ kiminsə evə ötürmək; **to be the first man** ~ **in the race** *id.* cıdır yarışında məsafəni birinci qət etmək/qalib gəlmək; 3. hədəfə, yerinə; **to go /to come /to get** ~ hədəfə düşmək; 4. axıra /qurtarana /yerinə oturana qədər, tamamilə; möhkəm; **to knock** ~ möhkəm çalmaq; **to drive a nail** ~ mıxı axıra qədər vurmaq
◊ **to bring** *smth.* ~ **to** *smb.* bir şeyi bir kəsə qandırmaq / başa salmaq / beyninə yeritmək; **to bring a crime / a fraud** ~ **to** *smb.* bir kəsin cinayətinin / fırıldağının üstünü açmaq; **to get** ~ 1) uğur qazanmaq; 2) qələbə çalmaq; 3) dəqiq zərbə endirmək; **to come/to get/to strike** ~ **to** *smb.* 1) bir kəsi mütəəssir etmək/çox həyəcanlandırmaq, bir kəsin yaralı yerinə toxunmaq; 2) anlamaq, dərk etmək; *The stupidity of his behaviour came home to him O özünün ağılsız rəftar etdiyini anladı;* **to bring oneself** ~ özünə gəlmək, özünü düzəltmək *(çətin, ağır iqtisadi vəziyyətdən sonra)*; **to pay** ~ haqqını/əvəzini vermək *(xidmətinə görə)*; **nothing to write** ~ **about** öyünmək üçün bir şeyin olmaması, fövqəladə bir şey yoxluğu
**home**[4] [houm] *v* 1. evə qayıtmaq / dönmək; *They homed from Paris Onlar Parisdən evə qayıtdılar/döndülər;* 2. yaşamaq, sakin olmaq; *He homes with me O mənimlə yaşayır*
**home-bird** ['houmbə:d] *n d.d.* 1. arvadın tam itaətində olan/arvadağız kişi; 2. ölüvay, iradəsiz adam; ≅ *tülküdən qorxan Əhməd*
**homebody** ['houm,bɔdɪ] *n* xanənişin / evdənçıxmaz / evdə oturmağı sevən adam
**home-born** ['houm'bɔ:n] *adj* yerli, yerli istehsal
**home-brew** ['houm'bru:] *n* 1. evdə hazırlanmış pivə; 2. *istehz.* əldəqayırma, primitiv
**home-comer** ['houm,kʌməʳ] *n* vətənə qayıtmış mühacir
**home-coming** ['houm,kʌmɪŋ] *n* vətənə qayıtma
**homecraft** ['houmkra:ft] *n* 1. kustar istehsal; 2. evdarlıq, ev işləri
**home-felt** ['houmfelt] *adj* səmimi; dərindən hiss edilmiş; təsirli; həyəcanlı
**homeland** ['houmlænd] *n* vətən, ana vətən
**homeless** ['houmlɪs] *adj* 1. evsiz; 2. sahibsiz *(uşaqlar haq.)*; ~ **condition** evsiz vəziyyət; ~ **boy** sahibsiz/baxımsız/kimsəsiz oğlan
**homelessness** ['houmlɪsnɪs] *n* 1. evsizlik; 2. sahibsizlik, kimsəsizlik, baxımsızlıq
**homely** ['houmlɪ] *adj* 1. sadə, adi, gündəlik; aza qane olan; ~ **meal** adi / gündəlik yemək; **a dear little** ~ **woman** mehriban sadə / ürəyiaçıq qadın; ~ **phrases** sadə xalq ifadələri; 2. ev kimi, rahat, səliqəli; ~ **home** ev rahatlığı, rahat ailə / dudman; 3. *arx.* biçimsiz, yaraşıqsız, görkəmsiz; **to be** ~ gözəlliyi ilə seçilməmək; **to be** ~ **with** *smb.* bir kəslə yaxın / dost olmaq, bir kəslə birevli kimi olmaq
**home-made** ['houm'meɪd] *adj* 1. evdə hazırlanmış; ~ **jam** evdə hazırlanmış mürəbbə; 2. kustar, əldəqayırma, əldəqayırılmış
**homemaker** ['houm,meɪkəʳ] *n rahat/səliqə-səhmanlı ailə həyatı yaratmış ev sahibəsi /ev xanımı*
**homer** ['houməʳ] *n* poçt göyərçini
**home rule** ['houmru:l] *n* özünüidarə, muxtariyyət
**home ruler** ['houm,ru:ləʳ] *n tar.* muxtariyyət tərəfdarı
**home-sick** ['houmsɪk] *adj* ev/vətən həsrəti çəkən, ev/vətən həsrətli; **to be** ~ ev/vətən üçün darıxmaq, ev/vətən həsrəti çəkmək
**home-sickness** ['houm,sɪknɪs] *n* vətən həsrəti
**homespun** ['houmspʌn] *adj* 1. evdə / əldə toxunmuş; ~ **cloth** evdə toxunmuş parça, qumaş; ~ **jacket** evdə toxunmuş gödəkcə; 2. *məc.* qaba, primitiv; yöndəmsiz, yaraşıqsız; iddiasız, aza qane olan; **simple** ~ **characters** sadə iddiasız insanlar; ~ **virtues** primitiv comərdlik/yaxşılıq
**homestead** ['houmsted] *n* 1. malikanə; ferma; kəndli təsərrüfatı; 2. homsted, ilk mühacirin torpaq sahəsi; **Homestead Act of Congress** Homsted aktı / qanunu *(mühacirlərin tutduqları torpaq sahələrindən pulsuz istifadə etmələri haqqında ABŞ konqresinin qanunu)*
**homesteader** ['houmstedəʳ] *n amer.* homsteder, torpaq sahəsi almış mühacir sakin; mühacir fermer
**homestraight** ['houm'streɪt] *n id.* at yarışlarında son və həlledici hissə, finiş hissəsi *(cıdırda)*

**homestretch** ['houm'stretʃ] *n* = **homestraight**
**home study** ['houm.stʌdı] *n* qiyabi təhsil; ~ **school** qiyabi məktəb; qiyabi təhsil kursları
**home thrust** ['houm'θrʌst] *n* **1.** uğurlu/sərrast/dəqiq zərbə, düz hədəfə düşən/dəyən zərbə *(qılıncoynatma yarışında və s.)*; **2.** *məc.* acı / zəhərli söz; sərrast / lap yerində deyilmiş söz / ifadə
**homeward**[1] ['houmwəd] *adj* evə aparan / gedən; geri / evə qayıdan
**homeward**[2] ['houmwəd] *adv* evə, evinə, evlərinə, gəldiyi yerə / vətənə
**homeward-bound** ['houmwəd'baund] *adj* vətənə/ evə yola düşən *(gəmi haq.)*
**homewards** ['houmwədz] *adj* = **homeward**[1,2]
**home-work** ['houmwə:k] *n* ev tapşırığı, dərs *(xüs. məktəblilər, tələbələr üçün)*; **to do** ~ dərsini etmək, dərs hazırlamaq
**homey** ['houmı] *adj* rahat, səliqəli, evdəki kimi rahat; **to feel** ~ özünü evdəki kimi hiss etmək
**homicidal** [.hɔmı'saıdl] *adj* **1.** *hüq.* qətl, qətlə aid; **2.** *tib.* ölüm qorxusuna düşmüş *(ruhi xəstələr haq.)*; ~ **mania** qətl maniyası / düşkünü; ölüm qorxusu
**homicide** ['hɔmısaıd] *n hüq.* **1.** qətl, öldürmə, qətlə yetirmə; *Homicide is not criminal when committed in self-defence Özünümüdafiə məqsədilə törədilən qətl cinayət xarakteri daşımır*; **felonious** ~ qəsdən qətl; **excusable** ~ qəsdsiz/qeyri-ixtiyari qətl; **2.** qatil, cani, adamöldürən
**homily** ['hɔmılı] *n* **1.** moizə, vəz etmə, xütbə; **2.** nəsihət, öyüd, dərs/öyüd vermə
**homing**[1] ['houmıŋ] *n* **1.** evə qayıtma, geri dönmə; **2.** göyərçinlərin uzaq məsafədən evə dönmə qabiliyyəti; **3.** *av.* yerə enmə haqqında göstəriş
**homing**[2] ['houmıŋ] *adj* **1.** geri/evə qayıdan, geri /evə yönələn /istiqamətlənən/gedən; **2.** ev üçün darıxan
**homing device** ['houmıŋdı'vaıs] *n* özütuşlanan / avtomatik tuşlanan raket başlığı
**homing missile** ['houmıŋ'mısaıl] *n hərb.* özütuşlanan / avtomatik tuşlanan raket / fişəng
**homing pigeon** ['houmıŋ'pıdʒın] *n* poçt göyərçini
**hominy** ['hɔmını] *n amer.* qarğıdalı yarması
**homoeopath** ['houmjəpæθ] *n tib.* homeopat *(homeopatiya üsulu ilə müalicə edən həkim)*
**homoeopathic** [.houmjə'pæθık] *adj* homeopatik, cüzi doza ilə verilən *(dərman)*
**homoeopathy** [.houmı'ɔpəθı] *n* homeopatiya *(allopatiyaya əks olan müalicə sistemi)*
**homogeneity** [hɔmoudʒe'ni:ıtı] *n* homogenlik, bircinslik, eynilik
**homogeneous** [.hɔmə'dʒi:njəs] *adj* homogen, təbiətcə və quruluşca eyni olan, eynicinsli, həmcins; ~ **members** *qram.* həmcins üzvlər
**homograph** [.hɔmou'græf] *n dilç.* homoqraf *(eyni cür yazılıb, müxtəlif məna kəsb edən söz)*
**homologate** [hɔ'mɔləgeıt] *v* **1.** razılaşmaq, razılıq bildirmək; **2.** *hüq.* təsdiq/qəbul etmək, paraflamaq
**homologous** [hɔ'mɔləgəs] *adj* uyğun, müvafiq, homoloji; ~ **tissues** eyniquruluşlu toxumalar
**homonym** ['hɔmənım] *n dilç.* **1.** omonim; **2.** adaş
**homophone** ['hɔməfoun] *n dilç.* homofon *(eyni cür səslənən, lakin mənaca fərqlənən sözlərdən hər biri)*
**homosexual**[1] [.hɔmə'sekʃuəl] *n* homoseksualist *(öz həmcinsi ilə cinsi əlaqəyə girən adam)*
**homosexual**[2] [.hɔmə'sekʃuəl] *adj* homoseksual *(öz həmcinsinə şəhvət bəsləyən)*
**homosexualism** [.hɔmə'sekʃuəlızm] *n* homoseksualizm *(öz həmcinsi ilə cinsi əlaqədə olma)*
**homosexuality** [.hɔmə'sekʃu'ælətı] *n* = **homosexualism**
**hone**[1] [houn] *n* **1.** bülöv, bülöv daşı; **2.** *tex.* xon *(cila bülövü)*, cilalama başlığı
**hone**[2] [houn] *v* **1.** itiləmək; **2.** cilalamaq
**honest** ['ɔnıst] *adj* **1.** düz, namuslu, halal, təmiz, vicdanlı; **an** ~ **man** təmiz/düz/vicdanlı adam; *He is poor but honest O, kasıbdır, ancaq təmiz adamdır*; ~ **employment** namuslu/halal əmək; **an** ~ **living** halal zəhmətlə yaşama, halal zəhməthaqqı; ~ **sweat** alın/zəhmət təri; **to be** ~ təmiz/düz/namuslu/vicdanlı/halal olmaq; **as** ~ **a man as ever lived / as ever broke bread/ as ever trod on earth** ömrü boyu halal zəhmətlə yaşamış/dünyanın ən namuslu/pak adamı; **2.** doğru, düzgün, gerçək; doğruçu, düzdanışan, səmimi, ürəyiaçıq, həqiqi, saf, açıq; **3.** *məc.* ağ; **an** ~ **face/countenance** üzüağ, alnıaçıq, açıq, səmimi çöhrə; ~ **confession** səmimi etiraf; **to give an** ~ **opinion** öz fikrini açıq bildirmək; **to be** ~ **with oneself** özünü aldatmamaq; *I shall be honest with you Sənə/Sizə açığını deyəcəm*; ~ **weight** təmiz /düz çəki; ~ **goods** təmiz/saf mal; ~ **wool** saf/təmiz yun; **4.** əxlaqlı, ismətli, bakirə, təmiz, yaxşı, vəfalı, sədaqətli, sadiq; **an** ~ **girl** əxlaqlı/bakirə/ismətli/təmiz qız; **an** ~ **wife** sədaqətli/vəfalı arvad; *She lost her honest name O öz təmiz adını ləkələdi*; **to make an** ~ **woman of** ***smb.*** təcavüz etdiyi *(tovlayıb bakirəliyini aldığı)* qıza evlənmək; nikahla öz günahını yumaq; **5.** *arx.* xeyirxah, möhtərəm, hörmətli; **an** ~ **fellow** xeyirxah/kara gələn adam; **my** ~ **gentleman** möhtərəm cənab; *Honest! Vicdan haqqı!*
**honestly** ['ɔnıstlı] *adv* **1.** düz, doğru, vicdanla, namusla, şərəflə; səmimi olaraq, açıq ürəklə, saf qəlblə, açıqdan-açığa; *I can honestly say Mən vicdanla deyə bilərəm; Honestly, that's all the money I have Doğrusu, olan pulum budur; Honestly, I'll do it! İnan/İnanın, mən bunu edəcəyəm!*
**hone-stone** ['hounstoun] *n* = **hone**[1] *(1-ci mənada)*
**honesty** ['ɔnıstı] *n* düzlük, təmizlik, doğruluq, namusluluq; namus, vicdan, sədaqət, səmimiyyət;



*Honesty is the best policy at. söz. Düzlük ən yaxşı siyasətdir, Doğruya zaval yoxdur*
**honey**[1] ['hʌnı] *n* **1.** bal; **comb** ~ şan balı; **sugared** ~ xarlanmış bal; **2.** *məc.* bal; şirinlik, dad, ləzzət, nəşə, zövq; *His words were honey to my soul Onun sözləri mənə ləzzət verdi/məlhəm kimi canıma yayıldı*; **3.** balşərab *(üzüm şərabının bir növü)*; çiçək şirəsi; **4.** *d.d.* müraciət formaları; quzu bala, əzizim, canım-gözüm, balaca, canım, sevgilim, göyərçinim, canım-ciyərim; *Come here, honeys! Bura gəlin görüm, quzu balalar! You look great tonight, honey! Əzizim, sən/siz bu axşam əzəmətli görünürsən/görünürsünüz*;
◊ ~ **and hug** *amer.* oxşama, nəvaziş, əzizləmə; qucaq, ağuş; **as sweet as** ~ bal kimi, şirin, dadlı; *Life is not all honey ≅ Həyatın acısı da var, şirini də*
**honey**[2] ['hʌnı] *v arx.* **1.** nəvazişlə danışmaq; **2.** oğrun-oğrun danışmaq; **3.** yaltaqlanmaq; özünü şirin salmaq, yaltaqlıq etmək; qılığına girmək, şirin dilini işə salmaq
**honey-bag** ['hʌnıbæg] *n* bal kisəciyi *(arılarda)*
**honey-bee** ['hʌnıbi:] *n* bal arısı
**honey-buzzard** ['hʌnı.bʌzəd] *n zool.* arıyeyən *(quş)*
**honeycomb** ['hʌnıkoum] *n* **1.** şan, arı şanı; **2.** qovuq, boşluq *(tökmə metalda)*
**honeycombed** ['hʌnıkoumd] *adj* dəlik-dəlik, arı şanı kimi; ~ **structure** arı şanı şəkilli quruluş
**honey-cup** ['hʌnıkʌp] *n bot.* nektari *(çiçəkli bitkilərdə şirə ayıran/ifraz edən orqan)*
**honey-dew** ['hʌnıdju:] *n bot.* qurd şirəsi *(bitki xəstəliyi)*
**honeyed** ['hʌnıd] *adj* **1.** balla şirinləşdirilmiş; ~ **wine** ballı şərab, bal vurulmuş şərab; **2.** *məc.* şirin; yaltaq; ~ **words** şirin sözlər
**honeymoon**[1] ['hʌnımu:n] *n* evliliyin ilk ayı; **to be on** ~ evliliyin ilk ayını gəzməkdə/ istirahətdə/səyahətdə keçirmək; **to go for a** ~ evliliyin ilk ayında səyahətə çıxmaq
**honeymoon**[2] ['hʌnımu:n] *v* evliliyin ilk ayını keçirmək; *They will honeymoon in Italy Onlar evliliyin ilk ayını İtaliyada keçirəcəklər*
**honey-mouthed** ['hʌnı.mauðd] *adj* **1.** şirindil, şirindanışan, şirindilli; **2.** yaltaq, üzəgülən
**honey-suckle** ['hʌnı.sʌkl] *n bot.* doqquzdon *(kol)*
**hong** [hɔŋ] *n* Çində xarici müəssisə; faktoriya *(Avropa tacirlərinin müstəmləkələrdə təşkil etdikləri ticarət məntəqəsi)*
**honk**[1] [hɔŋk] *n* **1.** xortuldama, xorultu; **2.** çöl ördəklərinin çıxartdığı səs; **3.** avtomobilin fit səsi *(köhnə avtomobillərdə sümsü vasitəsilə verilən siqnal)*
**honk**[2] [hɔŋk] *v* fit/siqnal vermək *(avtomobil haq.)*
**honor** ['hɔnə(r)] *n amer.* = **honour**
**honoraria** [.ɔnə'reərıə] *n* = **honorarium** *isminin cəm forması*
**honorarium** [.ɔnə'reərıəm] *n* qonorar *(elmi, ədəbi və s. işlər üçün əməkhaqqı)*
**honorary** ['ɔnərərı] *adj* **1.** fəxri; ~ **reward** fəxri mükafat; ~ **title** fəxri ad; **2.** məccani, ödənсsiz, pulsuz, müftə; ictimai əsaslarla işləyən; ~ **treasurer** fəxri/seçilmiş xəzinədar *(öz işini məccani icra edən xəzinədar)*
**honorific** [.ɔnə'rıfık] *adj* **1.** *(adətən istehza)* fəxri; ~ **post** fəxri vəzifə; **2.** hörmətli, möhtərəm
**honour**[1] ['ɔnə(r)] *n* **1.** namus, vicdan; düzlük, təmizlik, doğruluq; sədaqət, səmimiyyət; **professional** ~ öz peşəsinə sədaqət; **on / upon my** ~, **word of** ~ vicdan haqqı; **to pledge** ***one's*** ~ vicdanına and içmək, söz vermək; **point of** ~ namus məsələsi; **to conduct oneself with** ~ özünü nəzakətli aparmaq, alicənablıq göstərmək; **to be bound in** ~ **to do** ***smb.*** bir şeyi etməyi özünün mənəvi/vicdan borcu hesab etmək; **2.** təmiz ad, ad, şərəf, etibar; **to defend** ***one's*** ~ öz təmiz adını/şərəfini qorumaq; **to lose** ***one's*** ~ etibarını itirmək, namusunu ləkələmək, biabır/rüsvay olmaq; **3.** hörmət, ehtiram, şərəf, fəxr, sayğı; **guard of** ~ fəxri qarovul; **place / seat of** ~ fəxri yer; **peace with** ~ şərəfli sülh; **in** ~ **of** ***smb.*** bir kəsin şərəfinə, bir kəsə hörmət əlaməti olaraq; **dinner in** ~ **of** ***smb.*** bir kəsin şərəfinə nahar yeməyi; **a ceremony in** ~ **of those killed in battle** döyüşdə həlak olanlara ehtiram əlaməti olaraq keçirilən mərasim; **to show** ~ **to** ***one's*** **parents** valideynlərinə hörmət etmək; *I take your visit as a great honour Sənin / Sizin gəlişini / gəlişinizi böyük şərəf hesab edirəm*; **to win** ~ **in the battle** döyüş şöhrəti qazanmaq; **4.** iltifat *(ədəb, nəzakət, mərifət, rəsmiyyət ifadə etmək üçün)*; *Will you do me the honour of dining with me this evening? İltifat göstərib mənimlə bu axşam şam edərsənmi?/edərsinizmi?; Your Honour! Möhtərəm hakim!*; **5.** *pl* dövlət tərəfindən verilən mükafatlar/rütbələr/orden və medallar; **military** ~**s** hərbi rütbələr; **the last / funeral** ~**s** dəfn mərasimi, son ehtiram; **Birthday Honours** kralın doğum günü münasibətilə verilən mükafatlar; ~**s and ceremonies** *dən.* rəsmi-təzim etmə; **6.** *pl* fərqlənmə *(imtahanda)*; **to pass with** ~**s in history** tarix imtahanından əla qiymət almaq; **to graduate with** ~**s** fərqlənmə diplomu ilə bitirmək *(ali təhsil müəssisəsini)* **Olympic Games** ~ **rolls** Olimpiya oyunları iştirakçılarının fəxri siyahısı;
◊ *Honour bright! Vicdan haqqı!*; **to do the** ~**s of the house** qonaq qəbul etmək; ev sahibi vəzifəsini yerinə yetirmək; **to do the** ~**s of the table** süfrəyə / məclisə ağsaqqallıq etmək, məclisi yola vermək, masabəyilik etmək
**honour**[2] ['ɔnə(r)] *v* **1.** saymaq, şərəfləndirmək, ehtiram etmək, iltifat göstərmək / qılmaq; *I feel highly honoured İltifatınıza görə təşəkkür edi-*

*rəm, çox məmnunam; We are very much honoured by your company Öz iştirakınla / iştirakınızla bizi çox şərəfləndirdin/şərəfləndirdiniz, Sənin/Sizin iştirakın / iştirakınız bizim üçün böyük şərəfdir;* 2. (**with**) təltif etmək, layiq görmək, vermək, mükafatlandırmaq; *He was honoured with a title O, fəxri ada layiq görüldü; He honoured me with an invitation O, dəvətlə məni şərəfləndirdi;* 3. vaxtında ödəmək, vermək *(veksel borcunu, xərci, məsrəfi, çeki və s.)*; yerinə yetirmək *(öhdəliyi, şərti)*; **to ~ a bill/cheque** hesabı / çeki ödəmək

**honourable** ['ɔnərəbl] *adj* 1. düz, təmiz, vicdanlı, namuslu, səmimi; nəcib, alicənab, mərd; **~ a man** nəcib / alicənab insan /adam; **~ service** təmiz / qüsursuz xidmət *(orduda və s.)*; **~ intentions** xoş məram, təmiz niyyət; **to be ~ in** *one's* **obligations** öz vəzifəsinə vicdanla yanaşmaq; *Such sentiments are entirely honourable to you Bu cür hisslər/duyğular sənə / sizə şərəf gətirir /qazandırır;* 2. əsil, əsilzadə, adlı-sanlı, məşhur, tanınmış, əsil-nəcabətli; **descended from an ~ family** əsilzadələr nəslindən, adlı-sanlı/məşhur/tanınmış nəsildən/ailədən; 3. fəxri, şərəfli; **~ duty** şərəfli vəzifə; **~ distinctions** fərqlənmə nişanları *(orden, medal, nişan və s.)*; **~ mention** əmrlə təşəkkür elan etmə; 4. hörmətli, möhtərəm, ehtiramlı; **~ gentleman/member** möhtərəm centlmen / palata üzvü *(parlament və ya konqresin üzvü haq.)*; **my ~ friend** mənim hörmətli dostum *(parlament və ya konqres üzvünə müraciət)*; **my ~ colleague** hörmətli həmkarım; **Right Honourable** Möhtərəm *(bəzi əsilzadələrə, əyanlara, hakimlərə, kral müşavirlərinə müraciət forması)*

**hooch** [hu:tʃ] *n amer.* 1. spirtli içki *(qeyri-qanuni yolla əldə edilmiş içki haq.)*; 2. cecə arağı; **~ still** cecə arağı çəkmək üçün aparat; **~ ships** qeyri-leqal yolla ABŞ-a spirtli içki daşıyan gəmilər

**hood** [hud] *n* I 1. başlıq *(paltarın yaxasına tikilən)*; kapor *(çənənin altından lentlə bağlanan papaq)*; ləçək; 2. qatlanan/yığılan avtomobil/fayton damı; 3. *amer.* avtomobil kapotu; 4. qapaq; **bottle ~** butulka qapağı;

◊ *The hood does not make the monk ≅ Hər oxuyan Molla Pənah olmaz, Ağıl şlyapada olsaydı, göbələk ən böyük alim olardı*

**hood** [hud] *n* II *amer. sl.* **hoodlum** *isminin qısa forması*

**hoodlum** ['hudləm] *n d.d.* xuliqan; evyaran oğru, talançı, qanqster, bandit

**hoodoo**[1] ['hu:du:] *n* 1. cadugərlik, ovsunçuluq; 2. cadugər, ovsunçu; şaman; 3. qaradaban, bədbəxtlik gətirən hər hansı bir şey; 4. cadu nəticəsində əmələ gələn xətər/bəla/azar; bədnəzər; gözdəymə, gözə gəlmə; **to kill the ~** cadunu qırmaq, puç etmək

**hoodoo**[2] ['hu:du:] *v* 1. uğursuzluq/bədbəxtlik gətirmək; ovsunlamaq, tilsimə salmaq, tilsimləmək; 2. gözə/nəzərə gətirmək; 3. tas qurmaq *(ovsunu, cadunu, tilsimi qırmaq üçün)*; **to ~ the spirits** cinləri / şeytanları /əcinnələri qovmaq; 4. *d.d.* hay-küy/ qalmaqal salmaq, dalaşmaq; **to ~ about** *smth.* bir şey üçün hay-küy salmaq / qaldırmaq

**hoodwink** ['hudwɪŋk] *v* 1. aldatmaq, ələ salmaq, oynatmaq, axmaq yerinə qoymaq; gözdən pərdə asmaq; **to be easily ~ed** asanlıqla tora düşmək, tovlanmaq; *I was hoodwinked Məni tora saldılar, Məni axmaq yerinə qoydular;* **to ~** *smb.* **into** birini tovlayıb işə salmaq; 2. gözlərini bağlamaq; 3. *arx.* gizlətmək

**hooey** ['hu:ɪ] *n* cəfəngiyyat, axmaq/mənasız söz; *It's all a lot of hooey Bütün bunlar cəfəngiyyatdır/mənasız sözlərdir*

**hoof**[1] [hu:f] *n (pl ~s və ya* **hooves)** 1. dırnaq *(bəzi məməli heyvanlarda)*; **the cloven ~** qoşadırnaq; 2. dırnaqlı heyvan; **~ marks** dırnaq izləri; **~ meal** *k.t.* buynuz tozu *(gübrə)*;

◊ **on the ~** *amer.* diri *(heyvan haq.)*; **meat on the ~** ətlik mal ehtiyatı; **to sell corn on the ~** satış üçün nəzərdə tutulmuş mal-qaranı qarğıdalı ilə bəsləmək; **to beat the ~, to pad the ~** *d.d.* piyada getmək, daban döymək

**hoof**[2] [hu:f] *v* 1. dırnaqlarını/ayaqlarını yerə vurmaq / tappıldatmaq; dırnaqla / təpiklə vurmaq, təpik atmaq; 2. piyada / ayaqla getmək; *We hoofed it to San Francisco Biz San Fransiskoya qədər piyada getdik;* 3. *d.d.* işdən qovmaq, dalına bir təpik vurmaq; *He was hoofed (out) Onu işdən qovdular, Onun dalından dəydilər;* 4. *d.d.* rəqs etmək, oynamaq

**hoof-and-mouth disease** [hu:fənd'mauθdɪ 'zi:z] *n bayt.* dabaq, ağızyarası *(heyvan xəstəliyi)*

**hoofbeat** ['hu:fbi:t] *n* dırnaq çaqqıltısı / şaqqıltısı / şıqqıltısı

**hook**[1] [huk] *n* 1. qarmaq, çəngəl, qarmaqcıq; **~ and eye** çarpaz qarmağı, çalkeçir; 2. balıq qarmağı; 3. *məc.* tələ, duzaq, tor, cələ; **to swallow the ~** tələyə düşmək; 4. əyri bıçaq; oraq; dəhrə; 5. dəstəli qarmaq /çəngəl; 6. 1) diş, çiv; **iron ~** dişli/çivli nal; 2) *bot.* tikan; 3) *zool.* tikan, iynə, tikanlı axça *(balıqda)*; 7. *tex.* dəmir bənd pərçim; 8. yandan zərbə, huk *(boksda)*; 9. *mus.* qarmaq işarəsi *(notda)*; 10. *dən. d.d.* lövbər; 11. dirsək, döngə *(çayın)*; 12. *d.d. pl* mötərizə; 13. *d.d.* oğru, fırıldaqçı, kələkbaz;

◊ **by ~ and by crook** hər vasitə ilə, nə olursa olsun; **to drop off the ~s** *arx.* ayaqlarını uzadıb ölmək, o dünyalıq olmaq, gəbərmək; **to get off the ~** *amer. d.d.* işini itirmək, işdən çıxarılmaq /azad edilmək; **to take / to sling** *one's* **~** *məc.* qaçmaq, əkilmək; götürülmək, dabanına tüpürmək, *məc.* üstünə qoymaq

**hook**[2] [huk] *v* 1. qarmaq kimi əyilmək / qatlanmaq; 2. qarmaqcıqla bağlamaq; **to ~ a dress** paltarı bağlamaq *(qarmaqcıqlarla)*; 3. ilişdirmək; qarmaqlamaq; qarmaqdan asmaq; *The trolley was hooked on to the engine Vaqonet lokomotivə bağlanmışdı; The mirror was hooked to the wall Güzgü divara vurulmuş qarmaqdan asılmışdı;* 4. tutmaq, ovlamaq *(balığı)*; **to ~ a fish** 1) balıq tutmaq; 2) *məc.* tora salmaq, ələ keçirmək; **to ~ a husband** tora salmaqla ər tapmaq; 5. oğurlamaq; mənimsəmək, məngirləmək; *He hooked our money O bizim pullarımızı mənimsədi;* **to ~ in** qabaqcadan almaq; bir şeyə razı olmağa məcbur etmək; *Hook in! dən. Şlyupkanı/Qayığı qaldırl/ qaldırın!;* **to ~ out** ağzını aramaq, söz çəkmək/almaq

**hooker** ['hukə'] *n sl (xüs. ABŞ-da)* fahişə, qəhbə

**hookah** ['hukə] *n* 1. sulu qəlyan; 2. hoqqa

**hooky**[1] ['hukɪ] *n amer. d.d.*: **to play ~** işə çıxmamaq; dərsdən qaçmaq

**hooky**[2] ['hukɪ] *adj* qarmaq formasında, qarmaqşəkilli, qarmağaoxşar; qarmaqlı

**hooligan** ['hu:lɪgən] *n* xuliqan; **~ gangs** xuliqan dəstəsi / bandası

**hooliganism** ['hu:lɪgənɪzm] *n* xuliqanlıq

**hoop**[1] [hu:p] *n* 1. çənbər, sağanaq; **to trundle a ~** *id.* serso oynamaq *(xüsusi ağacla atılıb tutulan çənbər oyunu)*; 2. qapı *(kroket oyununda)*; 3. *tex.* qurşaq, kəmər; bugel *(dəmir halqa, bənd)*;

◊ **to go through the ~s** 1) ağır sınaqdan keçmək; 2) ağır sınaqdan keçirmək

**hoop**[2] [hu:p] *v* 1. çənbərlə/qurşaqla bərkitmək; bitişdirmək; çənbər taxmaq; **to ~ a cask** çəlləyə / boçkaya çənbər taxmaq; 2. *məc.* dövrəyə/mühasirəyə almaq; sıxmaq

**hooping-cough** ['hu:pɪŋkɔf] *n tib.* göyöskürək

**hoop-la** ['hu:pla:] *n* 1. halqa atma *(oyun)*; 2. *amer. d.d.* səs-küy; qalmaqal, qaraqışqırıq; qarışıqlıq, şuluqluq, həngamə; **a great ~ of propaganda** səs-küylü təbliğat kampaniyası

**hoop-net** ['hu:pnet] *n* əl toru *(uçan cücüləri və balıq tutmaq üçün)*

**hoopoe** ['hu:pu:] *n zool.* hop-hop, hüd-hüd, şinəbub, şanapipik

**hooray** [hu'reɪ] *int.* 1. ura!; 2. *pl* "ura" səsləri

**hoot**[1] [hu:t] *n* 1. bayquş səsi / ulaması; 2. *pl* qışqırıq, qıy vurma/çəkmə, nərə çəkmə; **~s of rage** qəzəbli nərə / qışqırıq;

◊ *I don't give / care a hoot / two hoots Bu məni qətiyyən narahat etmir, Bu mənim vecimə deyil*

**hoot**[2] [hu:t] *v* 1. qışqırmaq, ulamaq *(bayquş haq.)*; *An owl was hooting in the garden Bağda bir bayquş ulayırdı;* 2. (*həm də* **to ~ at**) bir kəsin üstünə qışqırmaq; qıy vurmaq; haylamaq; fitə/fıştırığa basmaq; **to ~ an actor** aktyoru fıştırığa basmaq; *The crowd hooted the speaker Camaat natiqi fitə basdı;* 3. uğuldamaq, fit vermək, ulamaq, vıyıldamaq; **to ~ away/off/out** hay-küylə qovub çıxartmaq; **to ~ down** fitə basıb susmağa məcbur etmək *(natiqi və s.)*

**hoot**[3] [hu:t] *int.* Tfu! Tuf! *(ovqattəlxlik, pərtlik, dilxorluq, acıq ifadə edən nida)*

**hootch** [hu:tʃ] *n* = **hooch**

**hootchy** ['hu:tʃɪ] *n amer. sl.* ədəbsiz/nalayiq/həyasız/biabırçı rəqs; **a ~ dancer** fahişəxana/tiryəkxana/qumarxana rəqqasəsi

**hootchy-kootchy** ['hu:tʃɪ'ku:tʃɪ] *n* = **hootchy**

**hooter** ['hu:tə'] *n* fit, fit səsi; sirena

**hooting** ['hu:tɪŋ] *adj* qışqıran, ulayan; **an owl ~ in the garden** bağda ulayan bayquş

**hoots** [hu:ts] *int.* = **hoot**[3]

**hoove** [hu:v] *n* qarın köpü, köp *(heyvanlarda)*

**hoover** ['hu:və'] *v* tozsoranla təmizləmək

**hooves** [hu:vz] *n* **hoof** *isminin cəm forması*

**hop**[1] [hɔp] *n* I 1. hoppanma, atılma, tullanma; dingildəmə; sıçrama; tullanıb/hoppanıb/atıla-atıla yaxınlaşma; 2. *d.d.* şənlənmə; xudmani rəqs şənliyi; rəqs

**hop** [hɔp] *n* II *bot.* 1. mayaotu; 2. *pl* mayaotu toxumu; **flavoured with ~s** mayaotulu, mayaotu vurulmuş *(pivə və s.)*

**hop**[2] [hɔp] *v* I 1. atılmaq, tullanmaq, hoppanmaq; bir ayağı üstündə hoppanmaq / sıçramaq/tullanmaq; *Sparrows were hopping about on the lawn Sərçələr çəmənlikdə o tərəf bu tərəfə hoppanırdılar; He had hurt his left foot and had to hop along O, sol ayağını zədələmişdi və bir ayağı üstə hoppana-hoppana hərəkət etmək məcburiyyətində qalmışdı;* 2. tullanıb/ hoppanıb keçmək, bir şeyin üstündən o tərəfə hoppanmaq; **to ~ over a hedge** çəpərin üstündən tullanıb keçmək; 3. atılıb minmək; **to ~ a train** atılıb qatara minmək; *He hopped a taxi O atılıb taksiyə mindi;* 4. axsamaq, ayağını çəkmək; *Away he hops with his crutch Qoltuqağacına söykənərək o axsaya-axsaya uzaqlaşır;* 5. atılıb-düşmək, oynamaq, rəqs etmək; 6. *d.d.* uçmaq *(bir yerdən başqa bir yerə təyyarə ilə)*; 7. *jarq.* əkilmək, götürülmək, daban almaq; *Hop off!, Hop it! Rədd ol!, İtil!, Sürüş burdan!;*

◊ **to ~ the stick/the twig** 1) ölmək; 2) *arx.* qaçmaq, əkilmək, yayınmaq *(borc verəndən, kreditordan)*

**hop** [hɔp] *v* II 1. mayaotunu toplamaq/yığmaq; 2. mayaotu vurmaq / əlavə etmək

**hop-bind** ['hɔpbaɪnd] *n* = **hop-bine**

**hop-bine** ['hɔpbaɪn] *n* cavan mayaotu budağı / qıçası; mayaotu gövdəsi

**hope**[1] [houp] *n* I 1. ümid; əməl, arzu, dilək; **vague ~** qeyri-müəyyən/mübhəm ümid; **~s of success** müvəffəqiyyətə ümid; **~s of peace** sülh arzusu; *There is not much hope that they are still alive Onların bu vaxta qədər sağ qalmalarına ümid azdır;* **to pin** *one's* **~s on** *smb.* bir kəsə ümid bəsləmək/bel bağlamaq; *I have good hope / strong hopes that he will soon be well Mən çox ümid edirəm ki, o tezliklə sağalacaq;* **to live in ~ of** *smth.* bir şeyin ümidilə yaşamaq; *I haven't much money now, but I live in hope İndi mənim çoxlu pulum yoxdur, ancaq ümidlə yaşayıram; We live*

*in hope of better time Biz daha gözəl çağlar ümidi ilə yaşayırıq*; **to hold out a ~ of *smth.*** bir şeyə ümid bəsləmək imkanı vermək; *The doctors could hold out no hope of recovery Həkimlər sağalmağa ümid bəsləməyi belə vəd edə bilmirdilər*; **to raise *smb.'s* ~s** bir kəsə ümid vermək, bir kəsi arxayın etmək; *Don't raise his hopes too much Onu çox da arxayın etmə/etməyin*; **2.** ümid yeri, ümid olma, güvənmə, güvənc; inam, bel bağlama; *He was the hope of his school O, məktəbinin ümid yeri idi; You are my last hope; if you can't help me, I am ruined Sən / Siz mənim son ümid yerimsən / yerimsiniz, əgər sən / siz də kömək edə bilməsən/bilməsəniz, onda mən məhv olduın; The navy was the great hope of the allies Müttəfiqlər donanmaya çox güvənirdilər*;

◊ **to hope against ~** möcüzəyə ümid etmək, ümidi möcüzəyə qalmaq

**hope** [houp] *n* II **1.** çox da böyük olmayan körfəz; **2.** dərə, çuxur

**hope²** [houp] *v* **1.** arxayın olmaq, ümid etmək, bel bağlamaq, inanmaq; **to ~ for *smth.*** bir şeyə arxayın olmaq; **to ~ for the best** hər şeyin daha yaxşı olacağına ümid etmək; *We are still hoping Biz hələ ümid edirik; We hope to see you again Biz ümid edirik ki, səni/sizi tezliklə yenə görəcəyik; "Will it rain tomorrow?" - "I hope not" "Sabah yağış yağacaqmı?" - "Ümid edirəm ki, yox"; "Will it be fine tomorrow?" - "I hope so" "Görəsən sabah hava yaxşı olacaqmı?" - "Ümid edirəm ki, hə"; We have had no news from him, but we are still hoping Ondan hələ xəbər yoxdur, ancaq biz ümidimizi itirməmişik*; **2.** intizarını çəkmək, xəyalən duymaq / gözləmək; *I hoped for better things from him Mən ondan bundan da artıq şeylər gözləyirdim*

**hoped-for** ['houptfɔ:ʳ] *adj* arzu olunan, istənilən; **long ~** çoxdan / səbirsizliklə gözlənilən, həsrəti çəkilən

**hopeful** ['houpful] *adj* **1.** ümidverici, ümidli, ümid verən; **to be / to feel ~ about the future** gələcəyə ümidli olmaq; *I feel hopeful of his success Mən onun uğuruna ümid bəsləyirəm*; **to be ~ of a remedy** dərmana ümid etmək; **2.** çox ümidlər verən; çox şey vəd edən; nikbin; *He seems quite a hopeful pupil O, çox ümidverici şagirdə bənzəyir*; **a ~ art student** ümidverici gənc rəssam; **~ prognosis** nikbin proqnoz

**hopefulness** ['houpfulnɪs] *n* **1.** nikbinlik; **2.** ümid

**hopeless** ['houplɪs] *adj* **1.** ümidsiz, çarəsiz, çıxılmaz, əlacsız; **~ struggle** ümidsiz mübarizə; **~ illness** çarəsiz xəstəlik; **~ situation** çıxılmaz vəziyyət; **2. (of, about, for)** bütün ümidlərini itirmiş, ümidi kəsilmiş, əli üzülmüş; **to be ~ about / of *smth.*** bir şeydən ümidi üzülmək/kəsilmək; *I am hopeless of effecting anything Bir şeyə nail olmaq ümidini itirmişəm*; **to be ~ for the future** gələcəyə ümidsizliklə baxmaq; **3.** islaholunmaz, *(insan haq.)*; **~ idiot** islaholunmaz kretin/əbləh; ağıldan kəm, gicbəsər; **~ waster** islaholunmaz bədxərc / israfçı

**hopelessness** ['houplɪsnɪs] *n* **1.** ümidsizlik, çarəsizlik; **2.** çıxılmazlıq, çətinlik

**hop-garden** ['hɔp.ga:dn] *n* mayaotu bitən yer, mayaotu sahəsi

**hopped-up** ['hɔpt'ʌp] *adj* **1.** keflənmiş, vurmuş; uyumuş *(narkotikdən)*; **2.** gücləndirilmiş, sürətləndirilmiş *(avtomobil haq.)*

**hopper** ['hɔpəʳ] *n* I **1.** hoppanma mütəxəssisi olan idmançı; **2.** hoppanan həşərat və cücülər *(birə, çəyirtkə, cırcırama və s.)*; **3.** dənlik *(dəyirmanda)*; **4.** yükləmə ağızlığı *(qıf və ya piramidaşəkilli)*; **5.** *d.y.* xopper *(yükü özüboşaldan vaqon)*; **6.** *k.t.* anbar, kəndi, daqqa, bunker

**hopper** ['hɔpəʳ] *n* II mayaotu toplayan / yığan / tədarük edən

**hopple¹** ['hɔpl] *n* **1.** çidar; **2.** *məc.* əsarət zənciri

**hopple²** ['hɔpl] *v* **1.** çidarlamaq *(atı)*; **2.** *məc.* əl-qolunu bağlamaq; mane olmaq, dolaşdırmaq, çaşdırmaq

**hopscotch** ['hɔpskɔtʃ] *n* "klas-klas" *(uşaq oyunu)*

**hoptoad** ['hɔptoud] *n d.d.* quru qurbağası

**hop-yard** ['hɔpja:d] *n* = **hop-garden**

**horally** ['hɔrəlɪ] *adv* hər saatdan bir

**horary** ['hɔ:rərɪ] *adj* **1.** birsaatlıq, bir saat davam edən; **~ angle** *astr.* saat bucağı; **2.** hər saatda olan; **3.** qısamüddətli

**horde** [hɔ:d] *n* **1.** *tar.* orda; **~s of nomads** köçəri tayfaların ordaları; **Golden Horde** Qızıl Orda *(qədim türk xalqlarının dövlət birləşməsi/forması)*; **2.** *pl* orda, qoşun; quldur / canilər dəstəsi, banda; **fascist ~** faşist qoşunları; **a ~ of lynchers** linççilər dəstəsi *(ABŞ-da Linç qanunu üzrə zəncilərə divan tutanlar)*; **3.** dəstə, yığın *(insan haq.)*; **~s of people** xalq kütləsi, insan yığını; **4.** sürü, dəstə: **a ~ of wolves** qurd sürüsü; **a ~ of locusts** çəyirtkə sürüsü

**horizon** [hə'raɪzn] *n* **1.** üfüq; *The sun sank below the horizon Günəş üfüqdə batdı*; **2.** *astr.* **apparent / visible ~** zahiri / görünən üfüq; **celestial / true ~** əsl / həqiqi göy üfüqü; **3.** *məc.* məlumat/bilik səviyyəsi; üfüq; *Science gives us a new horizon Elm bizə yeni üfüqlər açır, Elm bizim bilik səviyyəmizi genişləndirir*

**horizontal¹** [.hɔrɪ'zɔntl] *n* üfüqi xətt, horizontal *(eyni yüksəklikdə olan nöqtələri birləşdirən cızıqlar)*; **out of the ~** horizontal vəziyyətdən kənar, eyni yüksəklikdə olan nöqtələrin üst-üstə düşməməsi

**horizontal²** [.hɔrɪ'zɔntl] *adj* üfüqi; **a ~ line** üfüqi xətt; **~ bar** *id.* üfüqi tir; turnik; **~ alignement** trassanın/yolun planı; **~ union** *amer.* eyni peşə fəhlələrini birləşdirən sex həmkarlar təşkilatı

**hormone** ['hɔ:moun] *n fiziol.* hormon *(daxili sekresiya vəzilərinin qana buraxdığı maddə)*

**hormonic** ['hɔ:mɔnɪk] *adj* hormonal, hormona aid



**horn¹** [hɔ:n] *n* **1.** buynuz; **carved from ~** buynuzdan oyulmuş / düzəldilmiş; **2.** kərənay, şeypur, sümsü; **huntsman's ~** ovçu sümsüsü; **English ~** ingilis sümsüsü *(musiqi aləti)*; **French ~** valtorna *(nəfəsli musiqi aləti)*; **to blow / to wind the ~** sümsü çalmaq; **3.** fit, fıştırıq, sirena *(siqnal düdüyü)*; **4.** buynuzdan düzəldilmiş qədəh; **5.** barıtqabı; **6.** dabançəkən, dabangeydirən; **7.** diş, xillə, qılınc *(filin, qabanın ağzının kənarlarındakı iri möhkəm dişlər)*; **8.** *zool.* böcəklərdə hiss orqanı, bığcıq; **9.** *tex.* kronşteyn, dirsək *(altlıq, dayaq)*;

◊ **to take the bull by the ~s** qəti hərəkət etmək, əsas məsələnin həllindən yapışmaq; **to blow / to toot *one's* own ~** özünü öymək / tərifləmək; **to draw / to pull in *one's* ~** geri çəkilmək, tüpürdüyünü yalamaq, sözündən qaçmaq

**horn²** [hɔ:n] *adj* buynuz; buynuzdan qayrılmış; **a ~ comb/handle/buttons** buynuzdan qayrılmış daraq/dəstək/düymələr; *The knife has a horn handle Bıçağın buynuzdan qayrılmış dəstəyi /sapı var*

**horn³** [hɔ:n] *v* **1.** buynuzlamaq, buynuz vurmaq; **2.** buynuzu kəsmək; **to ~ cattle** malın buynuzunu kəsmək; **3.** əyib buynuz formasına salmaq *(bir şeyi)*

**hornbeam** ['hɔ:nbi:m] *n bot.* vələs, ulas *(ağac növü)*

**hornbeech** ['hɔ:nbi:tʃ] *n* = **hornbeam**

**horn blower** ['hɔ:n.blouəʳ] *n* şeypurçu, şeypurçalan, kərənayçalan, sümsüçalan

**horn-book** ['hɔ:nbuk] *n tar.* əlifba; *He teaches boys the horn-book O, oğlanlara əlifba öyrədir*

**horned** ['hɔ:nd] *adj* buynuzlu; **~ cattle** buynuzlu mal-qara; **~ cow** buynuzlu inək

**hornet** ['hɔ:nɪt] *n zool.* eşşəkarısı;

◊ **to stir up a nest of ~s, to bring a ~s' nest about *one's* ears** arının yuvasına çöp uzatmaq, yatmışları oyatmaq

**hornless** ['hɔ:nlɪs] *adj* buynuzsuz

**horn-mad** ['hɔ:n'mæd] *adj arx.* **1.** qəzəblənmiş, azğınlaşmış, qudurmuş; **2.** qısqanclıqdan dəli olmuş *(ər haq.)*

**hornpipe** ['hɔ:npaɪp] *n* **1.** hornpayp *(oynaq ingilis dənizçi rəqsi)*; **2.** hornpayp *(musiqi aləti)*

**horology** ['hɔrələdʒɪ] *n* **1.** vaxtın ölçülməsi; **2.** saatsazlıq peşəsi

**horoscope** ['hɔrəskoup] *n* **1.** horoskop, ulduzların cədvəli; **2.** ulduz / nücum falı; **to cast a ~** ulduz falı tərtib etmək; **the ~ of nations** xalqların gələcəyi; **3.** fala baxma, fal açma *(ulduzlar vasitəsilə)*

**horrible** ['hɔrəbl] *adj* **1.** qorxulu, qorxunc, dəhşətli, müdhiş, vahiməli, heybətli: **~ cruelty** dəhşətli amansızlıq / qəddarlıq / zalımlıq / rəhmsizlik; **~ disaster** dəhşətli / qorxulu / vahiməli fəlakət; **~ disease** qorxulu/dəhşətli xəstəlik; **2.** çox pis, son dərəcə ağır, çox güclü, iyrənc, mənfur; **~ weather** çox pis hava; **~ din** çox güclü hay-küy; *That was horrible of him O özünü çox pis/biabırçı apardı*

**horrid** ['hɔrɪd] *adj d.d.* pis, iyrənc, mənfur, murdar; **~ man** iyrənc /murdar adam; **~ weather** pis / murdar hava; **~ little boys** dözülməz/çox pis oğlan uşaqları; *How horrid of you! Bu nə iyrənc hərəkətdir, edirsən?/edirsiniz?; He was horrid to me O mənimlə çox pis rəftar etdi*

**horrific** [hɔ'rɪfɪk] *adj* dəhşətli, çox pis, son dərəcə ağır

**horrify** ['hɔrɪfaɪ] *v* bərk qorxutmaq, dəhşətə/vahiməyə salmaq; *We were horrified by what we saw Gördüklərimiz bizi dəhşətə saldı / gətirdi*

**horror** ['hɔrəʳ] *n* **1.** nifrət, dəhşət, hövl, qorxu, vahimə; ikrah; **to have a ~ of *smth.*** bir şeyə nifrət etmək; *They have a horror of war Onlar müharibəyə nifrət edirlər; She recoiled in horror from the snake O, ilandan dəhşətə gələrək yana/ kənara/geri atıldı; A good housewife has a horror of dirt Yaxşı evdar qadın natəmizliyi sevmir*; **2.** *pl* dəhşətlər, faciəli/ sarsıdıcı olaylar / hadisələr; **~s of war** müharibə dəhşətləri;*The papers are full of horrors Qəzetlər dəhşətli xəbərlərlə doludur*; **chamber of ~s** dəhşətlər salonu *(muzeydə)*; **~ film** dəhşətlər filmi *(dəhşətli, vahiməli hadisələr nümayiş etdirilən film)*

**horror-stricken, ~struck** [.hɔrə.strɪkən, ~.strʌk] *adj* dəhşət / vahimə bürümüş, dəhşət / vahimə içində olan

**hors de combat** ['ɔdə'kɔ:mba:] *n fr.* vuruşmaq iqtidarını itirmiş; sıradan və ya oyundan çıxmış

**hors-d'oeuvre** [ɔ:'də:vr] *n* **1.** *fr.* *(pl* **~s** [z]) qəlyanaltı, məzə, çərəz *(əsas xörəklər verilməmişdən əvvəl süfrəyə qoyulan yeməklər)*; **2.** *məc.* qeyri-adi, nadir bir şey

**horse¹** [hɔ:s] *n* **1.** at; **riding/saddle ~** minik atı; **proud ~** qızğın / harın at; **the flying / winged ~** *əs.* qanadlı at; **iron ~** *məc.* dəmir at *(parovoz, traktor, tank və s.)*; **to take ~** ata minmək; *To horse! Atlanın!*; **to back the wrong ~** cıdır mərcində uduzmaq; **to ride a ~ to death** atı çapıb bağrını çatlatmaq; **2.** ayğır; axta at; **3.** *məc.* arvadbaz, şorgöz kişi; **4.** süvari / atlı qoşun; **~ and foot** atlı və piyada qoşun; **light ~** yüngül silahlı süvari qoşun; **5.** *(cəmdə dəyişmir)* süvari, atlı, süvari əsgər; yaxşı at sürən; **five hundred ~** beş yüz süvaridən ibarət alay; **6.** *id.* tullanma eşşəyi; **~ with pommels** dəstəkli tullanma eşşəyi; **7.** *şahm.* at;

◊ **~ and foot** var gücü ilə; **white ~s** köpüklü dalğalar; **dead ~** pulu əvvəlcədən ödənilmiş iş; **to flog a dead ~** xəlbirlə su daşımaq, bihudə işlə məşğul olmaq; **to spur a willing ~** vicdanlı işçini sıxışdırmaq; *This is a horse of another / of different colour Bax bu, başqa məsələ; Hold your horses! amer.* ≅ *Ağzının sözünü bil!, Danışığına fikir ver!; Enough to make a horse laugh* ≅ *Bişmiş toyuğun gülməyi gəlir*; **to be on / to get**

**on/to ride/to mount** *one's* **high** ~ iddia satmaq, özünü çəkmək, lovğalanmaq, təşəxxüslənmək; *Come off your high horse! Özünü çəkmə görək! Burax lovğalanmağı!*; **a ~ on** *smb. amer.* bir kəslə zarafat; *Don't look a gift horse in the mouth* *at. söz.* ≅ *Bəy verən atın dişinə baxmazlar*

**horse²** [hɔ:s] *adj* **1.** at, ata məxsus; ~ **harness** at qoşqu ləvazimatı; at yəhər-qayışı; ~ **hoof** at dırnağı; ~ **ranch** atçılıq təsərrüfatı / zavodu; ~ **population** atların ümumi sayı / miqdarı; ~ **standing** at bağlanan yer; **2.** atla işləyən, at; ~ **farming** *k.t.* tarla işlərinin at qoşquları vasitəsilə aparılması; ~ **vehicle** at arabası; ~ **track / road /way** at-araba yolu; at-araba nəqliyyat yolu; **3.** kobud, şit, nalayiq; ~ **joke** kobud / şit zarafat;

◊ ~ **opera / stuff** *amer.* kovboy filmi / romanı

**horse³** [hɔ:s] *v* **1.** atla təchiz/at tədarük etmək; **to be well ~ed** kifayət qədər atı olmaq; **2.** atı qoşmaq; **to ~ a carriage** atı faytona/karetə qoşmaq; **3.** *amer.* ələ salmaq, masqaraya / lağa qoymaq

**horseback** ['hɔ:sbæk] *n* **1.** atın beli; **on ~** atlı, atla *(atın üstündə)*; **2.** *geol.* silsilə, sıra

**horse-bean** ['hɔ:sbi:n] *n bot.* at paxlası/lobyası

**horse-bee** ['hɔ:sbi:] *n* at mozalanı /milçəyi

**horse-box** ['hɔ:sbɔks] *n* **1.** atlar üçün vaqon; **2.** atları gəmiyə mindirmək üçün qəfəs

**horse-boy** ['hɔ:sbɔı] *n* mehtər, atabaxan; mehtər köməkçisi

**horse-breaker** ['hɔ:s.breıkəʳ] *n* at təlimçisi, at öyrədən

**horse-breaking** ['hɔ:s.breıkıŋ] *n* atı miniyə /qoşquya öyrətmə, ata təlim vermə, ata yeriş öyrətmə

**horse-breeder** ['hɔ:s.bri:dəʳ] *n* atçı, atçılıq mütəxəssisi

**horse-breeding** ['hɔ:s.bri:dıŋ] *n* atçılıq

**horse-chanter** ['hɔ:s.tʃa:ntəʳ] *n* at dəllalı

**horse-chestnut** ['hɔ:s'tʃesnʌt] *n bot.* hind/at şabalıdı

**horse-cloth** ['hɔ:sklɔθ] *n* çul, yəhəraltı

**horse-collar** ['hɔ:s'kɔləʳ] *n* xamıt

**horse-comb** ['hɔ:skoum] *n* qaşov

**horse-coper, horse-couper** ['hɔ:s.koupəʳ, ~.kaupəʳ] *n* at dəllalı / alverçisi

**horse-cover** ['hɔ:s.kʌvəʳ] *n* = **horse-cloth**

**horse-dealer** ['hɔ:s.di:ləʳ] *n* = **horse-coper**

**horse-flesh** ['hɔ:sfleʃ] *n* at əti

**horse-fly** ['hɔ:sflaı] *n zool.* göyün, böyələk *(cücü)*

**horse-godmother** ['hɔ:s'gɔd.mʌðəʳ] *n* kök qadın / arvad

**Horse-Guards** [.hɔ:s'ga:dz] *n* **1.** Süvari Qvardiya alayı; **Royal Horse Guards** Süvari kral qvardiya alayı; **2.** *tar.* süvari qvardiya alayı komandirinin qərargahı / ştabı

**horsehair** ['hɔ:sheəʳ] *n* **1.** at qılı; **2.** bortovka *(yaxalığa, yaxanın altına tikmək üçün at qılından hazırlanmış material)*

**horse-hoe** ['hɔ:shou] *n k.t.* atla işlədilən toxa / kərki

**horse-laugh** ['hɔ:sla:f] *n* kobud/gurultulu qəhqəhə; at kimi kişnəmə, qaqqıldama

**horse-mackerel** ['hɔ:s.mækrəl] *n zool.* **1.** stavrida *(balıq cinsi)*; **2.** xek balığı

**horseman** ['hɔ:smən] *n (pl* **-men** [-mən]) **1.** atlı, at sürən, minici; **2.** süvari əsgər; **3.** mehtər, atabaxan; **4.** at həvəskarı

**horsemanship** ['hɔ:smənʃıp] *n* **1.** at sürmə ustalığı /məharəti; **2.** atı minilməyə / miniyə öyrətmə məharəti

**horse-marine** ['hɔ:smə.ri:n] *n* öz işilə məşğul olmayan adam, öz yerini tapmamış adam; *Tell that to the horse-marines! Mənə nağıl danışma!/danışmayın! Mənə quşdili oxuma!/oxumayın!*

**horse-mill** ['hɔ:smıl] *n* **1.** atla işlədilən dəyirman, at dəyirmanı; **2.** *məc.* cansıxıcı / usandırıcı / bezikdirici iş; yeknəsəqlik

**horse-power** ['hɔ:s.pauəʳ] *n tex.* at gücü; **nominal ~** şərti / nominal at gücü

**horse-pox** ['hɔ:spɔks] *n* at çiçəyi *(xəstəlik)*

**horse-race** ['hɔ:sreıs] *n id.* cıdır, at çapışması / yarışı

**horse-radish** ['hɔ:s.rædıʃ] *n* **1.** *bot.* qıtıqotu, xren, acırğa; **2.** qıtıqotu kökü *(ədviyyat)*

**horseshoe** ['hɔ:sʃu:] *n* **1.** nal; **2.** *məc.* nalşəkilli /qövsşəkilli / yarımdairəvi hər hansı bir əşya; ~ **magnet** nalşəkilli maqnit; ~ **kidney** nalşəkilli böyrək; ~ **table** qövsşəkilli masa

**horseshoeing** ['hɔ:sʃu:ıŋ] *n* at nallama, atın nallanması

**horseshoer** ['hɔ:sʃu:əʳ] *n* nalbənd

**horsetail** ['hɔ:steıl] *n* **1.** at quyruğu; **2.** "at quyruğu" qadın saçı; **3.** *bot.* qatırquyruğu *(bitki)*

**horsewhip** ['hɔ:swıp] *n* at qamçısı

**horsy** ['hɔ:sı] *adj* **1.** at, ata məxsus; **2.** atsevən, atbaz; at sürməyi sevən

**hortative** ['hɔ:tətıv] *adj* öyüdverici, nəsihətverici, nəsihətamiz

**hortatory** ['hɔ:tətərı] *adj* = **hortative**

**horticultural** [.hɔ:tı'kʌltʃərəl] *adj* bağ, bağda bitən; bağçılıq, meyvəçilik; ~ **college** bağçılıq məktəbi; ~ **sundries** bağ avadanlığı; ~ **crops** bağ məhsulları

**horticulture** ['hɔ:tıkʌltʃəʳ] *n* bağçılıq, bağçılıq mədəniyyəti

**horticulturist** [.hɔ:tı'kʌltʃərıst] *n* bağçılıq mütəxəssisi; bağban

**hose¹** [houz] *n* I **1.** *tex.* xortum, rezin boru; şlanq, brandspoyt *(yanğınsöndürən şlanq)*; ~ **coupling** şlanq birləşdiricisi *(şlanqları bir-birinə bənd etmək üçün mufta)*

**hose** [houz] *n* II *(cəmdə dəyişmir)* **1.** corab, corab məmulatı; uzunboğaz corab; "qolf" corab; **2.** reytuz, trikotaj dizlik *(dar şalvar)*

**hose²** [houz] *v* şlanqla sulamaq / suvarmaq

**hosier** ['houʒəʳ] *n* trikotaj məmulatı taciri/alverçisi



**hosiery** ['houʒərı] *n* **1.** corab məmulatı; trikotaj dəyişəyi/alt paltarı/tuman-köynəyi; **2.** trikotaj məmulatları dükanı; **3.** trikotaj fabriki

**hospice** ['hɔspıs] *n* **1.** monastr mehmanxanası; **2.** sığınacaq; əlillər evi; **3.** tələbə yataqxanası; fəhlə yataqxanası

**hospitable** ['hɔspıtəbl] *adj* **1.** qonaqsevən, qonaqcıl, qonaqpərəst, qonaqpərvər; ~ **household** qonaqpərəst ev; **2.** səmimi, mehriban, üzügülər; ~ **reception** səmimi qəbul

**hospitableness** ['hɔspıtəblnıs] *n* qonaqsevərlik, qonaqcıllıq, qonaqpərəstlik

**hospitably** ['hɔspıtəblı] *adv* qonaqsevərliklə, qonaqpərəstliklə; səmimiyyətlə, mehribanlıqla, gülərüzlə

**hospital¹** ['hɔspıtl] *n* **1.** xəstəxana, müalicəxana; **lying-in ~** doğum evi; ~ **for the insane** ruhi xəstələr üçün xəstəxana; **to be in ~** xəstəxanada yatmaq; *He is still in hospital O hələ də xəstəxanada yatır; I'm going to the hospital to see my brother Mən xəstəxanaya qardaşıma baş çəkməyə gedirəm*; **to walk the ~s** xəstəxanada təcrübə keçmək; **2.** *hərb.* hospital, lazaret *(hərbi xəstəxana)*; **to establish a ~** cəbhədə hərbi xəstəxana açmaq; **to disestablish a ~** hərbi xəstəxananı yığışdırmaq; **3.: to go to ~** xəstəxanaya düşmək

**hospital²** ['hɔspıtl] *adj* xəstəxana; ~ **nurse** xəstəxanada tibb bacısı; ~ **ward** xəstəxana palatası/otağı; ~ **treatment** xəstəxana müalicəsi; ~ **orderly** xəstəxana xidmətçisi; *His mother is a hospital nurse Onun anası xəstəxana tibb bacısıdır*

**hospitality** [.hɔspı'tælıtı] *n* qonaqsevərlik, qonaqcıllıq, qonaqpərəstlik; səmimilik, mehribanlıq

**hospitalize** ['hɔspıtəlaız] *v* hospitala/xəstəxanaya qoymaq/yerləşdirmək *(xəstəni)*

**host¹** [houst] *n* I **1.** sahib, ev sahibi; **to act as ~** qonaq qəbul etmək, ev sahibi olmaq; *Mr Hill was away, Tom, the eldest son, acted as host at the dinner party Cənab Hill evdə yox idi, qonaqları nahar məclisində evin böyük oğlu Tom qəbul etdi*; **2.** mehmanxana sahibi; meyxana sahibi; **3.** radio / televiziya aparıcısı;

◊ **to reckon without** *one's* ~ ümidi boşa çıxmaq; ciddi səhv etmək, hesabda yanılmaq

**host** [houst] *n* II **1.** çoxlu, külli miqdar; yığın, saysız-hesabsız; *He has hosts of friends Onun saysız-hesabsız dostu var; We are faced with a host of difficulties Biz çoxlu/bir yığın çətinliklərlə üzləşirik*; **2.** *d.d.* qüvvə; **the heavenly ~, the ~s of heaven** səmavi qüvvələr *(mələklər haq)*; **3.** göy cisimləri; **Lord of Hosts** İlahi qüvvə

**hostage** ['hɔstıdʒ] *n* girov; **to take** *smb.* ~ bir kəsi girov götürmək; *The bandits demanded that one of the travellers should stay with them as a hostage Quldurlar səyyahlardan birinin onların yanında girov kimi qalmasını qətiyyətlə tələb etdilər*; **to exchange ~s** girovları dəyişmək;

◊ **~s to fortune** arvad və uşaqlar; ən yaxın ailə üzvləri

**hostel** ['hɔstl] *n* **1.** yataqxana *(xüs. tələbələr üçün)*; **2.** turist düşərgəsi; **3.** *arx.* mehmanxana, karvansara

**hosteler** ['hɔstələʳ] *n arx.* yataqxanada yaşayan tələbə

**hostess** ['houstıs] *n* **1.** sahibə, ev sahibəsi; **2.** mehmanxana sahibəsi; **3.** qonaqları, müştəriləri, gəlib-gedəni qarşılayan və yerbəyer edən şəxs *(mehmanxanada, restoranda və s.)*; **4.** stüardessa, təyyarə bələdçisi

**hostile** ['hɔstaıl] *adj* **1.** düşmən; ~ **army** düşmən ordusu; ~ **camp** düşmən düşərgəsi; **sides** düşmən tərəflər; ~ **disposition** düşmən mövqeyi; **2.** sərt, ədavətli, bədxah, pisniyyətli, qərəzli; qeyri-səmimi; ~ **actions** qərəzli hərəkətlər; ~ **feelings** qeyri-səmimi hisslər; ~ **looks** sərt baxışlar

**hostility** [hɔs'tılıtı] *n* **1.** düşmənçilik, ədavət, kin, düşmən münasibəti, antaqonizm *(barışmaz ziddiyyət)*; **perpetual ~** ardı-arası kəsilməyən düşmənçilik; **acts of ~** düşmənçilik hərəkətləri; **feelings of ~** düşmənçilik hissləri; ~ **to / against** *smth.* bir şeyə qarşı düşmənçilik münasibəti; **to feel ~ towards** *smb.* bir kəsə kin / ədavət bəsləmək; **2.** *pl* hərbi əməliyyatlar; **suspention of hostilities** atəşin / hərbi əməliyyatların kəsilməsi / dayandırılması

**hostler** ['ɔsləʳ] *n* **1.** mehtər, atabaxan; xidmətçi *(ekipajı müşayiət edən süvari xidmətçi)*; **2.** *amer. d.y.* təmirçi çilingər

**hot¹** [hɔt] *adj* **1.** isti, qaynar; ~ **weather** isti hava; ~ **air** isti hava; ~ **water** isti su; ~ **soup** isti şorba; *I like my soup hot Mən şorbanı isti sevirəm*; ~ **spring** qaynar/isti bulaq; ~ **iron** ərinmiş çuqun; *I am hot Mənə istidir*; **to make ~** qızdırmaq; *Running made me hot Qaçmaq məni istiləndirdi*; ~ **and ~** isti-isti, bu saat təndirdən çıxmış *(çörək haq.)*; **2.** qızğın, ehtiraslı, coşğun, hərarətli; ~ **anger** qızğın/ehtiraslı qəzəb; ~ **temper** tündxasiyyətlilik, tündməcazlıq; ~ **at work** işdə hərarətli/coşğun; **3.** hirsli, hiddətli, acıqlı, əsəbi, həyəcanlı; ~ **words** hiddətli/qəzəbli sözlər; **to get ~ over an argument** mübahisədə qızmaq / hirslənmək; **to grow ~ over** *smth.* bir şey üstündə özündən çıxmaq/hiddətlənmək; **4. (on, upon)** hərarətlə/dəlicəsinə/şövqlə bir şeylə maraqlanan; *He is hot on playing football O, futbol oynamağı dəlicəsinə sevir; I am not so hot on it Bu məni o qədər də maraqlandırmır*; **5.** gərgin, qızğın; amansız, şiddətli; ~ **contest** gərgin mübarizə *(yarışda)*; ~ **battle** şiddətli döyüş; **in the hottest part of the battle** döyüşün qızğın çağında; **in ~ haste** əlimyandıda, qaçaraq; **6.** təzə, bu günlərdəki, indicə alınmış/gətirilmiş; ~ **scent** təzə iy; ~

chase tez/o saat/isti-isti/ gecikdirmədən izləmə/təqib etmə; ~ **copy** *amer.* son məlumat, sensasiyaya səbəb olan xəbər *(qəzetdə)*; ~ **news** son xəbərlər; **to be ~ on the track of** *smb.* tez bir kəsin izinə düşmək, isti-isti bir kəsin ardınca getmək; ~ **from the press** təzəcə çapdan çıxmış *(qəzet, məlumat və s.)*; 7. tünd, acı, istiotlu; *The mustard is too hot Xardal çox tünddür / acıdır; This sauce is too hot Bu sous çox istiotludur*; 8. mübahisəli, qızğın mübahisə doğuran; maraqlı, mühüm, aktual, vacib; ~ **issues** mühüm / aktual/mübahisəli məsələlər; 9. təhlükəli, təhlükə ilə/narahatlıqla əlaqəli; ~ **wire** təhlükəli elektrik xətti; *Hot wire Həyat üçün təhlükəlidir (xəbərdarlıq işarəsi)*; ~ **cargo** təhlükəli yük; ~ **pilot** dəliqanlı pilot/təyyarəçi; ~ **laboratory** yüksək aktivli maddələri tədqiq edən laboratoriya;

◊ ~ **war** əsl müharibə; **the ~ place** *məc.* cəhənnəm, cəhənnəm odu; ~ **chair** *jarq.* elektrik stolu; ~ **corner** çətin/çıxılmaz vəziyyət; ~ **Scotch** *amer.* isti su qatılmış viski; ~ **air** *jarq.* gözə kül üfürmə, gözdən pərdə asma; **to drop** *smth.* **like a ~ potato** bir şeydən tələm-tələsik imtina etmək; ~ **stuff** *jarq.* qəhbə, fahişə, gəzəyən qadın; pornoqrafiya ədəbiyyatı; **to get into ~ water** bəlaya /pis vəziyyətə düşmək, *məc.* oda düşmək; **to get** *one's* **water** ~ özündən çıxmaq; *Don't make it too hot! Şişirtmə/ Şişirtməyin görək!*

**hot²** [hɔt] *v d.d.* *(həm də* **to ~ up**) 1. qızdırmaq, isitmək; 2. *məc.* qızışdırmaq, şişirtmək; **to ~ up hostility** düşmənçiliyi qızışdırmaq

**hotbed** ['hɔtbed] *n* 1. *k.t.* istixana, parnik; 2. *məc.* ocaq, mənbə; ~ **of disease** xəstəlik mənbəyi

**hot-blooded** ['hɔt'blʌdɪd] *adj* 1. dəliqanlı, qızğın; ehtiraslı; 2. hirsli, tündməcaz, tez hirslənən, tez özündən çıxan

**hot-brain** ['hɔt'breɪn] *n* = **hot-head**

**hot-brained** ['hɔt'breɪnd] *adj* = **hot-headed**

**hotchpot** ['hɔtʃpɔt] *n* 1. *hüq. əmlakın tən bölüşdürülməsi məqsədilə onun birləşdirilməsi (varislər arasında)*; 2. *n* = **hodge-podge**

**hotchpotch¹** ['hɔtʃpɔtʃ] *n* raqu *(xırda doğranmış ət və göy qovurması)*; qoyun əti suyunda hazırlanmış tərəvəz şorbası

**hotchpotch²** ['hɔtʃpɔtʃ] *adj* qarışıq, qatışıq, hər şey, nə desən, nə istəsən, cürbəcür

**hot-cockles** ['hɔt'kɔklz] *n arx.* gözübağlıca *(oyun)*

**hot dog** ['hɔtdɔg] *n amer.* 1. isti sosiska; 2. içinə isti sosiska qoyulmuş bulka

**hotel** [hou'tel] *n* hotel, mehmanxana; **American plan** ~ pansionlu mehmanxana; **European plan** ~ pansionsuz mehmanxana

**hotel-keeper** [hou'tel, ki:pəʳ] *n* hotel/ mehmanxana sahibi

**hot-foot** ['hɔtfut] *adv* tələsik, tez-tələsik, tələm-tələsik

**hot-frame** ['hɔtfreɪm] *n k.t.* parnik çərçivəsi

**hot-head** ['hɔthed] *n* tez özündən çıxan/ tezqızışan, dəliqanlı adam

**hot-headed** ['hɔthedɪd] *adj* tezqızışan, tez özündən çıxan, əsəbi, hirsli, tündxasiyyət, tündməcaz, dəliqanlı

**hot-house** ['hɔthaus] *n* 1. oranjereya, bitki yetişdirmək üçün şüşəbənd, istixana; 2. *tex.* meyvə və s. qurutmaq üçün yer/bina

**hot-line** ['hɔtlaɪn] *n* 1. dövlət başçıları arasında birbaşa telefon/teletayp rabitəsi/əlaqəsi; 2. gərginlik altında olan elektrik xətti

**hot-pepper** ['hɔt'pepəʳ] *n bot.* bibər, acı bibər

**hot-pot** ['hɔtpɔt] *n* ətlə kartof buğlaması / pörtləməsi

**hot-press** ['hɔtpres] *n* 1. isti pardaqlama / sığallama maşını/presi; 2. kalandr *(kağızı hamarlayıb ona parıltı verən maşın/pres)*

**hot-pressing** ['hɔt.presɪŋ] *n toxuc.* isti presləmə; parçaya parıltı verib satın halına salma

**hot-spirited** ['hɔt'spɪrɪtɪd] *adj* 1. atəşli, hərarətli, coşğun, qızğın, ehtiraslı, dəliqanlı; 2. tündxasiyyət, tündməcaz, tez hirslənən, tez özündən çıxan

**hotspur** ['hɔtspə:ʳ] *n* tündxasiyyət/ tündməcaz/ tez hirslənən/azğın/özbaşına adam

**hot-tempered** ['hɔt'tempəd] *adj* = **hot-headed**

**Hottentot** ['hɔtntɔt] *n* 1. hotentot *(Cənubi Afrikada yaşayan xalq)*; 2. hotentot dili; 3. vəhşi / kobud adam

**hot-water-bag** [.hɔt'wɔ:təbæg] *n* qrelka, rezin qovuq *(içinə isti su töküb bədənin ağrıyan yerinə qoyulan rezin qovuq)*

**hot-water-bottle** [.hɔt'wɔ:təbɔtl] *n* = **hot-water-bag**

**hot-well** ['hɔtwel] *n* isti su qaynağı

**hot-wind** ['hɔt'wɪnd] *n* qara yel *(quru və isti külək)*

**hound¹** [haund] *n* 1. ov iti, tazı; **the ~s** köpək/it sürüsü; **to follow the ~s** itlərlə ova çıxmaq; **to ride the ~s** atla ov etmək/ova çıxmaq; 2. it, köpək;

◊ **the ~s of fate** amansız/rəhmsiz tale; **to ride before/past the ~s** hadisələri qabaqlamaq

**hound²** [haund] *v* 1. itlərlə təqib etmək/ovlamaq; 2. *məc.* təqib etmək, dalına/izinə düşmək, izləmək; 3. gözümçıxdıya salmaq; təngə gətirmək; *Creditors hounded him Kreditorlar onu təngə gətirmişdilər; He was hounded by reporters Müxbirlər onu təngə gətirdilər*; 4. **(at, on, upon)** saldırmaq, qısqırtmaq, salışdırmaq; **to ~ a dog on** *smb.* iti bir kəsin üzərinə qızışdırmaq/saldırmaq; **to ~ down** axtarıb / izləyib tapmaq; ovlamaq, tutmaq; *The murderer was hounded down Qatili izləyib yaxaladılar*; **to ~ out (of)** sıxışdırıb çıxarmaq, çıxmağa məcbur etmək; qovmaq *(biabırçılıqla)*, rədd etmək; *He was hounded out of the city O, təqiblərdən cana gəlib şəhəri tərk etməyə məcbur oldu*

**hound's tongue** ['haundz'tʌŋ] *n bot.* köpəkdili otu



**hour** [auəʳ] *n* 1. saat *(60 dəqiqə)*; **twenty-four ~s** 24 saat, gün, bir gecə-gündüz; **to walk for ~s** saatlarla gəzmək/dolanmaq; **an ~'s work** bir saatlıq iş; *It is two hours from New York to Philadelphia Nyu-Yorkdan Filadelfiyaya iki saatlıq yoldur*; **the small ~s** sübh tezdən, dan yeri sökülən vaxtlar; *He got up in the small hours O, dan yeri söküləndə/sübh tezdən yerindən qalxdı*; **for ~s and ~s** saatlarla; **~ after ~** saatbasaat; **every ~ on the half ~** *amer.* hər saat, düz saat birdə/ikidə/ üçdə və s. *(radio verilişləri)*; 2. vaxt, çağ, müddət; **dark ~** qaranlıq / zülmət çağı; 3. *məc.* ağır vaxt/an; **unearthly ~** çox namünasib vaxt; **trying ~** çətin an, sınaq anı /vaxtı; **rush ~** ən qızğın/gərgin vaxt, basabas vaxtı; **at an early ~** tezdən, erkən; *Please come at an early hour Lütfən tezdən gəl/gəlin;* **the happiest ~ of my life** həyatımın ən xoşbəxt anı; 4. *pl* iş vaxtı/ günü; müəyyən olunmuş vaxt; **office ~s** iş vaxtı/saatları *(müəssisədə)*; **school ~s** məktəbin iş vaxtı; **~s of exchange** birjanın iş saatları; **a reduction of ~s** iş gününün qısaldılması; 5. dərs, məşğələ; akademik saat, dərs saatı;

◊ *one's* ~ ölüm anı/saatı; *My hour has struck Mənim vaxtım yetişib/çatıb; I have had my hour Mən öz kamıma çatmışam, Mən gördüyümü görmüş, dövranımı sürmüşəm*; **till all ~s** xoruz banına qədər, dan yeri sökülənədək, çox gec

**hourly¹** ['auəlɪ] *adj* 1. hər saat olan, hər saatdan bir olan, saatda bir; **an ~ service of train** hər saatdan bir yola düşən qatar; **an ~ dose of medicine** hər saatdan bir verilən dərmanın dozası; 2. bir saatlıq; **~ output** bir saat ərzində istehsal olunan məhsul; 3. daimi, həmişəlik; **to live in ~ fear of discovery** daimi ifşa edilmə qorxusu içində yaşamaq; **in ~ dread of death** hər an gözlənilən ölüm təhlükəsi

**hourly²** ['auəlɪ] *adv* hər saat/an, saatbasaat, saatda bir, hər saatdan bir; *This medicine is to be taken hourly Bu dərman hər saatdan bir qəbul edilməlidir; We're expecting news hourly Biz hər an / hər dəqiqə xəbər gözləyirik*

**hour-plate** ['auəpleɪt] *n* sferblat *(saat və ölçü cihazlarında rəqəmlər olan lövhəcik)*

**house¹** [haus] *n* (*pl* -s [hauzɪz]) 1. ev, bina *(əsasən bir ailənin yaşaması üçün tikilmiş mülk); New houses are going up everywhere Hər tərəfdə / yerdə yeni evlər ucalır /tikilir; I've bought a new house Mən təzə ev almışam*; 2. mənzil, ev, məskən; **at John's ~** Conun evində, Congildə; *We'll meet at your house Biz sənin /sizin evində/evinizdə görüşəcəyik*; **to clean ~** *amer.* evi / mənzili təmizləmək / yığışdırmaq / qaydaya salmaq; **to move ~** başqa evə köçmək, mənzili dəyişdirmək; 3. yer, dam; **poultry ~** quş damı, quşxana, toyuq damı; **monkey ~ in a zoo** meymunxana *(heyvanxanada)*; 4. ev, ailə; ev-eşik, təsərrüfat; **~ and home** ailə, dudman; **noisy ~** səs-küylü ailə; *Meals are always late in our house Biz həmişə gec çörək yeyirik;* **to receive** *smb.* **into** *one's* **~** bir kəsi öz ailəsinə / evinə qəbul etmək; **to keep ~** ailəni / təsərrüfatı /ev-eşiyi idarə etmək; **to keep a good ~** təsərrüfatı bacarıqla idarə etmək, evi yaxşı saxlamaq/dolandırmaq; **to keep the ~** evdə oturmaq; **to keep open ~** qapısı hamının üzünə açıq olmaq; 5. nəsil, ailə, sülalə, xanədan; **the House of Windsor** Britaniya kral ailəsi; **an ancient ~** qədim nəsil; *Plague on both your houses! (Shakespeare) Hər ikinizin də tifağı dağılsın!*; 6. palata *(parlamentin)*; **House of Commons** İcmalar Palatası; **House of Lords** Lordlar Palatası; **to enter the House** parlament üzvü seçilmək; **the third House** *amer. d.d.* "üçüncü" palata, konqresin kuluarları; **to divide the House** adbaad səsvermə keçirmək; **to keep / to make a House** yetərsayı təmin etmək; *The house rose at 9 Palatanın iclası saat 9-da qurtardı*; 7. firma, şirkət, ticarət evi; **trading / business ~** ticarət firması; **wholesale ~** topdansatış firması; **publishing ~** nəşriyyat; **disorderly ~, ~ of ill fame** qəhbəxana, fahişəxana; 8. teatr, kinoteatr, salon; **picture ~** kinoteatr; *Every word was heard in every part of the house Tamaşa salonunun hər yerində hər bir söz aydın eşidilirdi*; **full ~** anşlaq, "bütün biletlər satılıb, dolu salon; **thin ~** yarıboş salon; 9. tamaşaçılar, salondakılar; **appreciative ~** artistləri hərarətlə qarşılayan tamaşaçılar; **to bring down the ~** gurultulu alqışlarla nəticələnmək; 10. tamaşa, seans; *The first house starts at 5 Birinci seans saat 5-də başlanır*; 11. ibadətxana, məbəd, kilsə; **the ~ of God** Allahın evi; **~ of prayer/of worship** ibadətxana; 12. *dən.* budka; 13. mehmanxana, karvansara; bar, aşxana, meyxana, içkixana;

◊ **~ divided** ailə nifaqı/ixtilafı/çəkişməsi; qəbilə davası; **House divided Speech** *amer. tar.* quldarlığın / köləliyin ləğvinə dair prezident Linkolnun çağırış nitqi; **the dark/narrow ~** son mənzil, qəbir evi, məzar, gor; *That's on the house* 1) *Xərcini firma ödəyir*, 2) *Ev sahibi qonaq edir*

**house²** [hauz] *adj* ev, otaq; **~ arrest** ev dustağı; **~ plant** otaq bitkisi; **~ slippers** ev ayaqqabısı, şap-şap, şap-şup

**house³** [hauz] *v* 1. ev vermək, mənzillə təmin etmək; sığınacaq vermək; *We can house you for a day or two Biz sənə/sizə bir və ya iki günlük sığınacaq verə bilərik; The cave houses snakes İlanlar mağarada yuva salıblar/ yaşayırlar*; 2. yaşamaq, mənzil tutmaq, yerləşmək; *You and I can house together Biz birlikdə yerləşə bilərik, Biz birlikdə mənzil tutub yaşaya bilərik*; 3. tutmaq; yerləşmək; *This cottage will never house us Bu kottec qətiyyən bizi tutmayacaq; The building houses lawyer's office Vəkillər idarəsi/kontoru bu binada yerləşir*; 4. saxlamaq, yığ-

maq *(anbara)*; *You can house your spare books in the attic Artıq kitablarını / kitablarınızı çardaqda saxlaya bilərsən/ bilərsiniz*
**house-agent** ['haus.eɪdʒənt] *n* evlərin satılması və kirəyə/icarəyə verilməsilə məşğul olan komisyoner; mənzil müvəkkili
**houseboat** ['hausbout] *n* üzən ev *(yaşayış, istirahət üçün uyğunlaşdırılmış gəmi/qayıq və s.)*
**house-boy** ['hausbɔɪ] *n* xidmətçi, qulluqçu, ev gədəsi
**house-break** ['hausbreɪk] *v* ev çapmaq/yarmaq / soymaq / oğurlamaq
**house-breaker** ['haus.breɪkəʳ] *n* 1. ev yaran oğru; 2. *pl* evlərin sökülməsilə məşğul olan firma
**house-bug** ['hausbʌg] *n* taxtabiti
**house-dog** ['hausdɔg] *n* 1. gözətçi köpək/it; 2. ev iti
**house-dove** ['hausdʌv] *n* 1. ev/əl göyərçini; 2. xanənişin/evindən çıxmaz qadın/qız
**housedress** ['hausdres] *n* ev paltarı
**house-duty** ['haus.dju:tɪ] *n* ev hesabı/evbaşı vergi *(İngiltərədə)*
**house-factor** ['haus.fæktəʳ] *n* = **house-agent**
**house-father** ['haus.fa:ðəʳ] *n* 1. ailə başçısı; 2. baş tərbiyəçi *(uşaq evində, pansionatda)*; internat məktəbin müdiri
**house-flag** ['hausflæg] *n* gəmiçilik bayrağı
**houseful** ['hausfl] *n* dam/ev dolusu; ~ **of guests** ev dolusu qonaq
**household¹** ['haushould] *n* 1. ailə; ev adamları *(ailə üzvləri kimi başqasının evində yaşayanlar)*, bizimkilər; **the master of the** ~ evin sahibi, ailənin başçısı; 2. təsərrüfat, dudman, ev-eşik; 3. saray; **the Household** padşah / hökmdar sarayı; **the Royal Household** əlahəzrət kral sarayı; kral sarayı; **a Gentleman of the Household** saray adamı; 4. *pl* ikinci növ un, iri üyüdülmüş kəpəkli un
**household²** ['haushould] *adj* 1. ailəvi, məişətə / yaşayışa / evə / ev işlərinə / təsərrüfata aid olan; ~ **expenses** ev xərcləri, ailəni dolandırma xərcləri; ~ **soap** paltar sabunu, paltaryuyan sabun; ~ **appliances** məişət cihazları; ~ **goods** təsərrüfat malları; ~ **arts** *amer.* evdarlıq kursları *(biçmə və tikiş, təzə doğulmuş körpələrə qulluq və s. daxil olmaqla)*; 2. saray, saraya məxsus; **Household Brigade** saray mühafizə/ keşikçi dəstəsi *(ingilis kralının cangüdənləri və mühafizə alayı)*; ~ **troops** *hərb.* qvardiya *(seçmə qoşun hissəsi)*; **Household Cavalry** süvari qvardiya *(İngiltərədə)*; 3. kəpəkli undan hazırlanmış /bişirilmiş; ~ **bread** kəpəkli undan bişirilmiş çörək, qara çörək; ~ **loaf** kəpəkli undan bişirilmiş buxanka / kömbə / baton çörək;
◊ ~ **word** daha çox işlədilən, dildən düşməyən söz/ifadə; *Your name is a household word with us Adın / Adınız dilimizdən düşmür, Biz sənin / sizin haqqında/ haqqınızda həmişə danışırıq*
**householder** ['haushouldəʳ] *n* 1. ev sahibi / yiyəsi; 2. icarədar, icarəçi, kirəçi; 3. kirənişin; 4. ailə başçısı
**household-stuff** ['haushould'stʌf] *n* ev şeyləri
**housekeeper** ['haus.ki:pəʳ] *n* 1. təsərrüfat müdiri, təsərrüfat işlərilə məşğul olan qadın; açarçı, anbardar; 2. evdar qadın; **a thrifty** ~ qənaətcil ev sahibəsi; *My wife is a good housekeeper Mənim arvadım yaxşı evdar qadındır*
**housekeeping** ['haus.ki:pɪŋ] *n* 1. evdarlıq; **light** ~ sadə/yüngül ev işləri *(səhər yeməyi hazırlama, ütüləmə və s.)*; 2. *hərb.* inzibati-təsərrüfat işləri
**houseless** ['hauslɪs] *adj* evsiz, sığınacaqsız, sığınacağı olmayan
**housemaid** ['hausmeɪd] *n* ev qulluqçusu
**housemaid's knee** [hausmeɪdzni:] *n* *tib.* diz qapaqüstü kisəciyin iltihabı
**housemaster** ['haus.ma:stəʳ] *n* baş tərbiyəçi; məktəbin nəzdindəki internatın / pansionun müdiri
**housemother** ['haus.mʌðəʳ] *n* 1. evin/ ailənin anası, ailənin başçısı; 2. baş tərbiyəçi qadın *(internatda, uşaq evində və s.)*
**house-painter** ['haus.peɪntəʳ] *n* rəngsaz, ev rəngləyən
**house-party** ['haus.pa:tɪ] *n* bir neçə günlüyə dəvət olunmuş qonaqlar *(xüs. bağ evinə)*
**house-physician** ['hausfɪ.zɪʃn] *n* 1. xəstəxana nəzdindəki mehmanxanada yaşayan həkim; 2. xəstəxananın baş interni
**house-to-house** ['haustə'haus] *adj* evbəev; ~ **fighting** *hərb.* küçə döyüşü; ~ **visitation** evbəev yoxlama
**house-top** ['haustɔp] *n* 1. dam; 2. dam örtüyü
**house-warming** ['haus.wɔ:mɪŋ] *n* yeni mənzilə köçmək münasibətilə düzəldilən qonaqlıq, yeni mənzil şirnisi, təzə evə gözaydınlığı vermə
**house-wife** ['hauswaɪf] *n* I *(pl* **-wives** [-waɪvz]) 1. evdar qadın *(işləməyən)*; 2. təsərrüfatçı; evdar; *She is a bad housewife O, pis evdar qadındır*
**house-wife** ['hauswaɪf] *n* II iynə, sap qabı; gündəlik istifadə edilən kiçik qadın mücrüsü
**housewifely** ['haus.waɪflɪ] *adj* qənaətkar, qənaətcil; ailəcanlı, evdar, evin qayğısını çəkən
**housewifery** ['haus.wɪfərɪ] *n* ev işləri; evdarlıq
**housework** ['hauswə:k] *n* ev işləri; evdarlıq
**housing** ['hauzɪŋ] *n* I 1. mənzil şəraiti; mənzillə təmin olunma, mənzil məsələsi; **inadequate** ~ qeyri-qənaətbəxş mənzil şəraiti; mənzil sahəsinin çatmaması; *More housing is needed for old people Yaşlı adamları mənzillə daha yaxşı təmin etmək üçün əlavə mənzilə ehtiyac var; The housing in this part of the town is sub-standard Şəhərin bu hissəsindəki mənzil şəraiti normadan aşağıdır*; **to provide** ~ **for** mənzillə təmin etmək, ev vermək; 2. mənzil tikintisi; **funds for** ~ mənzil tikintisi üçün vəsait/fond; 3. sığınaq, sığınacaq, daldalanacaq; 4. *tex.* korpus, gövdə;



örtük, qapaq, futlyar; 5. *tex.* oyuq, girinti; yuva; 6. *k.t.* bordaqda saxlanma; 7. yaşayış məntəqəsi; ~ **estate** yaşayış binaları tikilmiş sahə; ~ **estate road** yaşayış məntəqəsindən/sahəsindən keçən yol; ~ **development** mənzil tikintisi
**housing** ['hauzɪŋ] *n* II yəhəraltı, çul
**housing-cloth** ['hauzɪŋklɔθ] *n* = **housing** II
**hove** [houv] **heave** *felinin pt, pp formaları*
**hovel¹** [hɔvl, hʌvl] *n* 1. daxma, koma, komacıq, daxmacıq, koma *(şaxdan, ağacdan, küləşdən tikilmiş)*; 2. örtü, sipər; talvar, çardaq; 3. taxça, divar oyuğu *(heykəl qoymaq üçün)*
**hovel²** ['hɔvl,' hʌvl] *v* mal-qaranı çardağın/ talvarın altına yığmaq
**hover¹** ['hɔvəʳ] *n* 1. süzmə *(havada)*; uçma; pərvaz etmə; 2. intizar, qeyri-müəyyən vəziyyət
**hover²** ['hɔvəʳ] *v* 1. süzmək *(havada)*, uçmaq *(həm də* **to ~ out/over)**; 2. dayanmaq, asılıb qalmaq *(havada)*; 3. hərlənmək, fırlanmaq, dolanmaq, veyl-veyl gəzmək; *Don't hover over me! Əl çək/ çəkin məndən! Məni təngə gətirmə!/ gətirməyin!!*; 4. son həddə olmaq; məruz qalmaq, giriftar olmaq; *He was hovering between life and death O, olumla ölüm arasında idi*; 5. tərəddüd etmək, qərara gələ bilməmək; *He hovered on the brink of decision O, bir qərara gəlməkdə tərəddüd etdi*
**hovering** ['hɔvərɪŋ] *adj* süzən, asılıb qalan, dayanan *(havada)*; **a hawk ~ overhead** başı üstündə süzən qırğı *(quş)*; **a helicopter ~ over the house** evin üstündə dayanan/asılıb qalan vertolyot/helikopter
**how¹** [hau] *adv* 1. *pron.* 1) necə?, nə təhər/ cür?; *How shall I dress? Mən necə geyinim?; How do you do it? Bunu necə düzəldirlər?, Bunu necə edirlər?; How is he? O necədir?; How is it?, How comes it? Bu necə olur?; How is the word spelt? Bu söz necə yazılır?*; 2) neçə?, nə qədər?; *How old is he? Onun neçə yaşı var?; How far is the town? Şəhər nə qədər uzaqdır?; How much time did it take you? Sən/Siz buna nə qədər vaxt sərf etdin?/etdiniz? Bu, nə qədər vaxt apardı?; How many people were there? Orada nə qədər adam var idi?* 3. *d.d.* neçəyə?; *How is milk to-day? Bu gün süd neçəyədir?*
**how²** [hau] *conj* necə; **to know ~ to behave** özünü necə aparmağı bilmək; *Tell him how to do it Bunu necə etməyi ona de / deyin; Ask him how he does it Ondan soruş ki, bunu o, necə edir*
**how³** [hau] *inter.* necə; neçə, nə qədər, necə də *(nida cümlələrində)*; *How strange! Necə də qəribədir!; How absurd! Nə qədər mənasız!; How kind of you! Sən / Siz nə qədər də iltifatlısan/iltifatlısınız!; How you do like to tease one! Adamı açıqlandırmaqdan necə də xoşun/xoşunuz gəlir!, Adama sataşmaqdan necə də həzz alırsan! / alırsınız!*;
◊ *How much? Neçəyə dedin?/dediniz?, Neçəyə?, Neçə oldu?; How about a game of chess? Bir partiya şahmatla aran necədir?; How about a couple of dollars until pay-day? Maaş alana qədər mənə bir-iki dollar versən/versəniz, necə olar?; And how! Əlbəttə! Təbii! Başqa cür ola da bilməz!, Məhz belə də olmalıdır!; How come? Axı nəyə görə?, Bu necə ola bilər ki?, Bu necə olur ki?; How come you were there? Necə ola bilər ki, sən/siz orada olasan?/olasınız?; How come you did not ask him? Necə ola bilər ki, sən/ siz bunu ondan soruşmadın?/soruşmadınız?; How so? Necə?, Necə yəni?, Necə olur?; How on earth do I know? Axı, mən haradan bilim?, Axı, mən necə bilim?; How the devil!, How the deuce!, How the hell!, How the dickens! Cəhənnəmə ki!, Lənətə gələsən! /gələsiniz!, Lənət sənə, kor şeytan!, Lənət şeytana!, Allah qəhr etsin!, Allah bəlasını versin!, Yerə girəsən!, Bu nə hoqqadır!, Kül başına!; Here's how? Şərəfinə!/Şərəfinizə!, Sənin /Sizin sağlığına!/sağlığınıza!; All you know how! Lap əla, Var gücü ilə!; How do you do?, How d'you do? Salam!; Necəsən? Necəsiniz?; How are you? Necəsən? Necəsiniz?; How are you getting on?, How goes it? How are things? İşlər necədir?, İşlər necə gedir?*
**howdah** ['haudə] *n* kəcavə, təxt-rəvan *(filin və ya dəvənin belində)*
**how-do-you-do** ['haudju'du:] *int.* 1. *Salam!; Necəsən?/Necəsiniz?*; 2. salamlama; 3. *d.d.* incə / nazik məsələ; müşkül məsələ; *Here is a nice/a pretty/a fine how-do-you-do, Əcəb işdir! Buna nə sözün var! İşə bax a!*
**however¹** [hau'evəʳ] *adv* 1. hər necə *(olsa)*, hər halda, nə qədər, nə olursa olsun, nə təhər; *However you do it, the result is the same Nə təhər edilirsə edilsin, nəticə eyni olacaq; However hard he tried he didn't succeed Nə qədər çalışsa da, o heç nəyə nail olmadı; We are against interference, however slight Nə qədər xırda bir məsələ olsa da, biz müdaxilə etməyin əleyhinəyik*; 2. necə?, nə cür?; *However did you manage to do it? Sən / Siz bunu etməyə necə nail oldun?/ oldunuz?*
**however²** [hau'evəʳ] *conj* bununla belə, hər halda, baxmayaraq, hərçənd, da... də; *Later, however, he decided to go Bununla belə, o, getmək qərarına gəldi; However this is not common Hər halda bu tez-tez baş vermir; I cannot, however, approve of it Hər halda / Bununla belə mən bunu təqdir edə bilmərəm*
**howitzer** ['hautsəʳ] *n* *hərb.* qaubitsə *(qısalüləli ağır top)*
**howl¹** [haul] *n* 1. ulama, ulaşma; **the ~ of a wolf** canavarın/qurdun ulaması; 2. vıyıltı; **the ~ of the wind** küləyin vıyıltısı; 3. inilti, zarıltı; fəryad, fəğan, nalə, ah-vay, şivən, qışqırıq, bağır-

tı, səs; **a ~ of despair** ümidsizlik naləsi/fəryadı; 4. gurultu, səs; **a ~ of laughter** qəhqəhə səsi
**howl²** [haul] *v* 1. ulamaq, ulaşmaq; *Wolves howled all night Qurdlar/Canavarlar bütün gecəni uladılar*; 2. vıyıldamaq; *The wind howled through the trees Külək ağacların arasında vıyıldayırdı*; 3. inildəmək, zarıldamaq, fəryad/fəğan etmək, nalə çəkmək, şivən qoparmaq / salmaq; **to ~ with pain** ağrıdan inildəmək; 4. qəşş etmək *(gülməkdən, ağlamaqdan və s.)*; *The boys howled with laughter Oğlanlar gülməkdən qəşş etdilər*; **to ~ away** hay-küylə qovmaq/qovub dağıtmaq; **to ~ down** hay-küylə səsi batırmaq; *The crowd howled down the speaker Camaatın səs-küyü natiqin səsini batırdı*
**howler** ['haulə'] *n* 1. ağıçı, ağı deyən qadın; 2. *d.d.* ağılsız/çox kobud səhv; 3. *zool.* meşə şeytanı *(Cənubi Amerikada meymun cinsi)*;
◊ **to come a ~** biabır olmaq, gülünc vəziyyətə düşmək
**howling¹** ['haulıŋ] *n* ulama, ulaşma; vıyıltı, qışqırıq, bağırtı, gurultu
**howling²** ['haulıŋ] *adj* 1. ulayan, ulaşan; **~ dog** ulayan it; **wolves ~ in the forest** meşədə ulayan canavarlar; 2. vıyıltı, gurultu; **~ wind** vıyıldayan külək; 3. bağıran, qışqıran, ucadan ağlayan; **~ baby** qışqıran / ucadan ağlayan uşaq; ağlağan/ağlayan/çığıran/zır-zır uşaq; 4. biabırçı, yolverilməz, görünməmiş, eşidilməmiş; **~ shame** görünməmiş rüsvayçılıq/ biabırçılıq
**hoy** [hɔı] *int.* ey!; ay!
**hoyden** ['hɔıdn] *n* 1. şıltaq/səs-küylü qız; 2. gənc/bayağı xanım
**hub¹** [hʌb] *n* 1. çarx / təkər topu; vtulka, oymaq; 2. *məc.* diqqət mərkəzi , maraq nöqtəsi; "ürək", "göbək"; **~ of industry** sənaye mərkəzi; **~ of commerce** ticarət mərkəzi; *He thinks that Boston is the hub of the universe O, Bostonu dünyanın göbəyi / mərkəzi hesab edir*
**hub²** [hʌb] *n* = **hubby**
**hubble-bubble** ['hʌbl.bʌbl] *n* 1. = **hookah**; 2. quruldama, qur-qur / loq-loq etmə; 3. mənasız/ bihudə boşboğazlıq
**hubbub** ['hʌbʌb] *n* gurultu, hay-küy, səs-küy, qışqırıq; mərəkə, qalmaqal; **~ of voices** qışqırıq səsləri
**hubby** ['hʌbı] *n d.d.* = **husband**
**hubris** ['hju:brıs] *n yun.* iftixar, fəxr; təkəbbür, qürur, təşəxxüs, iddia
**huckaback** ['hʌkəbæk] *n* cod kətan; **~ towel** cod dəsmal/ məhrəba
**huckleberry** ['hʌkl.berı] *n bot.* qaragilə, mərcanı
**huckle-bone** ['hʌklboun] *n anat.* dabanüstü /topuq / aşıq sümüyü
**huckster¹** ['hʌkstə'] *n* 1. alverçi, çərçi; 2. qazancına alıb-satan, dəllal; tamahkar adam
**huckster²** ['hʌkstə'] *v* 1. alverçilik / çərçilik etmək; 2. qiymətləşmək, qiymət danışmaq; 3. dəllallıq etmək, qazancına alıb-satmaq
**huddle¹** ['hʌdl] *n* 1. yığın, topa, qalaq, nizamsız halda tökülmüş şeylər; qucaq; **~ of ideas** fikir yığını, qarışıq düşüncələr; 2. dəstə, güruh, camaat; 3. sürü, naxır; 4. qarışıqlıq, hərc-mərclik; qaçaqaç, əl-ayağa düşmə, vəlvələ; 5. *amer.* məxfi müşavirə, məsləhətləşmə; sözləşmə, dilləşmə, dilbir / əlbir olma, razılıq; **to go into ~** 1) gizlicə əlbir olmaq, gizli / məxfi dilləşmək, məxfi razılığa gəlmək; 2) meydançada oyunçuların xəlvəti məsləhətləşməsi *(futbolda)*
**huddle²** ['hʌdl] *v* 1. qalaqlamaq, topalamaq, necə gəldi tökmək; **to ~ clothes into a suitcase** paltarları necə gəldi çamadana basmaq; *He huddled the children into a car O, uşaqların hamısını maşına basdı*; 2. **(out of)** qovmaq, bayıra çıxarmaq; *They huddled the crowd out of the hall Onlar camaatı zaldan qovub çıxartdılar*; 3. *(həm də* **to ~ together/up)** topalamaq, bir yerə yığmaq; **to ~ up/together sheep** qoyunları bir yerə yığmaq/topalamaq; 4. toplaşmaq, bir yerə yığılmaq, bir-birinin üstünə çıxmaq; *Sheep huddled together for warmth Qoyunlar isinmək üçün bir yerə topalaşdı*; 5. büzüşmək, qısılmaq, yığılmaq, qıvrılıb /yumrulanıb yatmaq, qıvrılmış halda yatmaq; *Tom was cold, so he huddled up against his brother in bed Toma soyuq olduğundan o, çarpayıda qardaşına qısıldı*
**hue¹** [hju:] *n* rəng; çalar, ton *(boyaların fərq inceliyi)*; **the ~s of the rainbow** göy qurşağının bütün rəngləri/çalarları
**hue²** [hju:] *v* rəngləmək, rəng/çalar vermək
**hue and cry** ['hju:ən'kraı] *n "Tutun", Saxlayın" çağırışı*; hiddət / həyəcan çağırışı; **to raise a ~** "tutun", "saxlayın" qışqırmaq; haray salmaq, təhlükə siqnalı vermək; *The workers raised a hue and cry against new tax proposals Fəhlələr yeni vergi təkliflərinə qarşı etiraz səslərini ucaltdılar/ hay-haray saldılar*
**huff¹** [hʌf] *n* 1. hirs /qəzəb tutması; qəzəbdən alışıb yanma, hiddətlənmə; inciklik, incimə, küsü; *He is in a huff O inciyib/ küsüb*; **to take the ~, to get into a ~** hiddətlənmək, *məc.* od tutub/alışıb yanmaq; 2. alçaldılmaq, təhqir olunmaq; 3. fuk, oyunda götürülən/vurulan daş *(dama oyununda)*
**huff²** [hʌf] *v* 1. acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək, özündən çıxartmaq; incitmək, toxunmaq, könlünü sındırmaq; **to feel ~ed** özünü təhqir olunmuş hesab etmək; 2. acıqlanmaq, hirslənmək, əsəbiləşmək; incimək, könlü sınmaq, tutulmaq, qaşqabağını tökmək, sımsırığını sallamaq, küsmək; 3. parçalamaq; hücum etmək, üstünə düşmək; 4. **(into, out, of)** qorxutmaq, hədələmək, qara-qorxu gəlmək; hədə-qorxu ilə məcbur etmək; **to ~ *smb.* into silence** bir kəsi hədə-qorxu ilə susmağa məcbur etmək; **to ~ *smb.* out of the room** bir kəsi hədə-qorxu ilə otaqdan qovmaq/çıxartmaq



**huffish** ['hʌfıʃ] *adj* 1. tezacıqlanan, tezhirslənən, tündməcaz, əsəbi; şıltaqçı, şıltaq; 2. küsəyən, tezinciyən, dəymədüşər
**huffy** ['hʌfı] *adj* 1. acıqlandırılmış; incidilmiş; 2. küsəyən, tez küsən, dəymədüşər; 3. *məc.* yüngül, yelbeyin, hərdəmxəyal
**hug¹** [hʌg] *n* ağuş, sarılma, bərk qucaqlama; **to give *smb.* a ~** bir kəsi bərk-bərk qucaqlamaq/ağuşuna almaq/bağrına basmaq; *She gave her mother a big hug O, anasını bərk-bərk qucaqladı*
**hug²** [hʌg] *v* **(-gg-)** 1. bərk-bərk qucaqlamaq, bağrına basmaq, ağuşuna almaq; *The child was hugging her doll Uşaq öz gəlinciyini bağrına basmışdı*; 2. qucaqlaşmaq; *They hugged each other Onlar qucaqlaşdılar;* bir-birini qucaqlamaq, sarmaşmaq; 3. *məc.* tutmaq, tutub getmək; **to ~ the shore/the coast** sahili tutub getmək *(gəmi haq.)*; **to ~ the right side of the road** yolun sağ tərəfini tutub getmək, yolun sağ tərəfi ilə hərəkət etmək; 4. əqidəsinə sadiq olmaq/qalmaq; **to ~ *one's* beliefs** öz əqidəsinə sadiq olmaq/ qalmaq; **to ~ cherished beliefs** müqəddəs inamından əl çəkməmək/götürməmək
**huge** [hju:dʒ] *adj* nəhəng, çox iri / böyük, zorba, azman; **~ mountain** nəhəng dağ; **~ animal** çox böyük/ zorba heyvan; **~ eater** acgöz, qarınqulu; **~ difference** çox böyük fərq; **~ profits** böyük/misli görünməmiş gəlir; **~ delight** çox böyük həzz/səfa
**hugely** ['hju:dʒlı] *adv* çox, artıq, olduqca, dedikcə, son dərəcə; *I'm hugely pleased Mən son dərəcə məmnunam, Mən həddindən çox razıyam*
**hugeness** ['hju:dʒnıs] *n* böyüklük, nəhənglik, zorbalıq
**hugger-mugger¹** ['hʌgə.mʌgə'] *n* 1. *d.d.* nizamsızlıq, qarışıqlıq, qaydasızlıq, səliqəsizlik; dolaşıqlıq; 2. *arx.* xəlvəti/məxfi / gizli iş, sirr; **in ~** gizli / xəlvəti / məxfi
**hugger-mugger²** ['hʌgə.mʌgə'] *adj* 1. gizli, xəlvəti, məxfi; 2. səliqəsiz, nizamsız, dolaşıq, qarışıq
**hugger-mugger³** ['hʌgə.mʌgə'] *v* 1. gizlətmək, xəlvətcə etmək; sirr halında saxlamaq; 2. bir şeyi nizamsız halda / necə gəldi etmək
**huggle** ['hʌgl] *v* = **hug²**
**hulk** [hʌlk] *n* 1. köhnə gəmi korpusu / gövdəsi, anbar kimi istifadə olunan gəmi korpusu; 2. *tar.* həbsxana/dustaqxana/qazamat kimi istifadə olunan üzən gəmi; **condemned to the ~s** üzən həbsxanada / gəmidə buxovlanıb həbsə məhkum olunmuş *(adam)*; 3. "ayı", "öküz" *(ağır, ləng nəhəng adam)*
**hulking** ['hʌlkıŋ] *adj* ağır, ləng; iri, çox yekə, yekəpər; *Get out of my way, you hulking great idiot! Yekəpər əbləh, çəkil yolumdan!*
**hull¹** [hʌl] *n* 1. boş qabıq; qabıq; 2. kuzov, ban, gövdə; gəmi korpusu; 3. gəminin üfüqdə görünməyən hissəsi
**hull²** [hʌl] *v* 1. qabığını soymaq/təmizləmək, qabıqdan çıxarmaq, soymaq; arıtmaq; **to ~ peas** noxudun qabığını çıxarmaq/təmizləmək/almaq; 2. gəminin korpusunu mərmi ilə deşmək
**hullabaloo** [.hʌləbə'lu:] *n* çığırtı, qışqırıq, qışqırtı, bağırtı, hay-küy, səs-küy; qalmaqal, mərəkə; *What a hullabaloo! Bu nə hay-küydür!; What's all this hullabaloo about? Bütün bu qalmaqal nə üçündür?*
**hulled** [hʌld] *adj* qabığı çıxarılmış/təmizlənmiş
**hullo, hallo, hello** [hə'lou] *int.* 1. *Salam*; 2. Alo! *(telefon çağırışı)*; 3. Hey! Ey! Bura bax və s. *(çağırış, diqqət, təəccüb ifadə edən nida)*
**hum¹** [hʌm] *n* 1. vızıltı, vızıldama; **the ~ of bees** arıların vızıltısı; 2. uğultu, uğuldama, gurultu, guvultu; **the ~ of traffic** nəqliyyatın uğultusu /gurultusu; **the ~ of industry** zavodların aramsız uğultusu; 3. zümzümə; "hm" demə; **the ~ of a song** mahnının zümzüməsi; **to give a ~ of approbation** razılıqla "hm" demək
**hum²** [hʌm] *v* 1. vızıldamaq; *The bees were humming in the garden Arılar bağda vızıldayırdılar*; 2. uğuldamaq, guruldamaq, guvuldamaq; *The street hums all the time Küçədən aramsız gurultu səsi gəlir; My head hums Başım guruldayır*; 2. "hm" demək, hmıldamaq, mızıldamaq; mələmək; 3. zümzümə etmək, dodağının altında oxumaq; *She was humming a song to herself O öz-özünə bir mahnı zümzümə edirdi*; 4. layla(y) demək, lay-la(y) deyib/çalıb yatırtmaq; **to ~ *smb.* to sleep** bir kəsi layla(y) çalıb yatırtmaq
**human¹** ['hju:mən] *n* insan, adam; *Dogs can hear much better than humans İtlər insanlardan/adamlardan daha yaxşı eşidə bilirlər*
**human²** ['hju:mən] *adj* 1. insan, adam; insana xas olan; **~ being** insan; **~ body** insan/adam bədəni; **the ~ race** insan nəsli/ cinsi; **~ voice** adam/insan səsi; **~ nature** insan təbiəti; **Human Rights** insan hüquqları; **~ milk** insan/qadın südü; **~ ceiling** insan imkanının son həddi; *It's human to err Səhv etmək insana xas olan xüsusiyyətdir; To err is human, to forgive divine İnsan səhv edən, Allahsa bağışlayandır*; 2. sosial, ictimai; **~ institutions** ictimai institutlar/müəssisələr; **~ progress** cəmiyyətin inkişafı
**humane** [hju:'meın] *adj* 1. insansevən, ürəyiyumşaq, rəhmli, ədalətli, incəqəlbli, insaflı, insani, insana layiq; **a man of ~ character** insanpərvər/ insaflı/ürəyiyumşaq/rəhmli adam; **a ~ officer** rəhmli zabit; **~ measure** ədalətli tədbir; **~ treatment** mehriban rəftar; **Humane Society** suda qərq olanları/batanları xilasetmə cəmiyyəti; 2. humanitar; **~ studies** humanitar elmlərlə məşğul olma

**humanely** [hju:ˈmeɪnlɪ] *adv* insancasına, insanpərvərcəsinə, insan/adam kimi, insafla, ədalətlə

**humaneness** [hju:ˈmeɪnnɪs] *n* insaniyyət, insanpərvərlik, mürüvvət, insaf, mərhəmət, rəhmlilik, mehribanlıq

**humaniform** [hjuˈmænɪfɔ:m] *adj biol.* insanabənzər

**humanism** [ˈhju:mənɪzm] *n* humanizm, insansevərlik, insaniyyət

**humanist** [ˈhju:mənɪst] *n* 1. humanist, insanpərvər, insansevən; 2. humanitar elm sahəsində mütəxəssis; 3. humanizm tərəfdarı

**humanitarian**[1] [hju:ˌmænɪˈteərɪən] *n* 1. humanist, insanpərvər; 2. filantrop *(xeyriyyəçiliklə məşğul olan adam)*; 3. dönük, kafir *(İsa peyğəmbərin ilahiliyini, ülviyyətini inkar edən şəxs)*

**humanitarian**[2] [hju:ˌmænɪˈteərɪən] *adj* 1. insansevən, insanpərvər, mürüvvətli, insaflı; 2. humanist; 3. humanitar, ictimai

**humanity** [hju:ˈmænɪtɪ] *n* 1. bəşəriyyət, insanlar, insanlıq; **crimes against** ~ bəşəriyyətə / insanlığa qarşı cinayətlər; 2. *d.d.* insan kütləsi, camaat; *The theatre poured out its humanity Camaat teatrdan axın-axın bayıra töküldü*; 3. insanpərvərlik, adamlıq, mərhəmət; **to treat a prisoner with** ~ məhbusla /dustaqla mərhəmətlə rəftar etmək; 4. *pl.* insan təbiəti, insani məziyyətlər / keyfiyyətlər; 5. *pl* **the Humanities** humanitar elmlər

**humanize** [ˈhju:mənaɪz] *v* 1. humanistləşdirmək; humanistləşmək; 2.: *tib.* **to** ~ **cow's milk** inək südünün tərkibini dəyişərək qadın (ana) südünə yaxınlaşdırmaq *(süni qidalanma üçün)*

**humankind** [ˈhju:mənˈkaɪnd] *n* bəşəriyyət, insan nəsli

**humanly** [ˈhju:mənlɪ] *adv* 1. insana layiq, insancasına, adam/insan kimi; **to be** ~ **fallible** insana xas zəifliyə malik olmaq; 2. insan gücü dairəsində; *It is humanly impossible Bu, insan gücü xaricindədir/ fövqündədir*

**humble**[1] [ˈhʌmbl] *adj* 1. təvazökar, sadə, utancaq; *He is very humble in the company of his superiors O özündən böyüklərlə oturub-durmaqdan utanır*; 2. kasıb, miskin; sadə, adi; cüzi; **men of** ~ **birth** adi nəsildən olan adamlar, əsilzadələr zümrəsinə mənsub olmayan insanlar; ~ **income** cüzi gəlir; ~ **occupation** sadə peşə/məşğuliyyət; ~ **dwelling** adi/miskin mənzil; 3. itaətli, itaətkar, müti; ~ **request** acizanə xahiş; your ~ **servant** bəndəniz, qulunuz;

◊ **to eat** ~ **pie** alçalmaq; təhqirə məruz qalmaq, tüpürdüyünü yalamaq

**humble**[2] [ˈhʌmbl] *v* 1. ram etmək, itaətə gətirmək; 2. alçaltmaq, hörmətdən salmaq, təhqir/rüsvay/biabır etmək; **to** ~ ***one's*** **enemies** öz düşmənlərini alçaltmaq; *Their pride was humbled by the defeat Məğlubiyyət onların ləyaqətini/ qürurunu alçaltdı*; **to** ~ **oneself** alçalmaq, özünü alçaltmaq; başını aşağı etmək

**humble-bee** [ˈhʌmblbi:] *n zool.* eşşəkarısı

**humbug**[1] [ˈhʌmbʌg] *n* 1. yalan, hiylə, kələk, fırıldaq; 2. cəfəngiyyat, boş/mənasız söz, laqqırtı; 3. nanəli nabat

**humbug**[2] [ˈhʌmbʌg] *v* 1. aldatmaq, kələk / hiylə/fırıldaq gəlmək, tovlamaq; 2. fırıldaqçılıq/hiyləgərlik etmək, adam aldatmaq, dələduzluq etmək; 3. **(into, out of, from)** aldadaraq vadar etmək; **to** ~ ***smb.*** **into doing** ***smth.*** bir kəsi aldadaraq bir şeyi etməyə təhrik/vadar etmək; **to** ~ **money out of/from** ***smb.*** hiylə işlədib bir kəsdən pul çəkmək, bir kəsi tovlayıb pul qopartmaq; *Don't try to humbug me Məni aldatmağa cəhd etmə / etməyin*

**humdinger** [ˌhʌmˈdɪŋəʳ] *n amer. d.d.* 1. əla oğlan, kişi adam; 2. əla şey

**humdrum**[1] [ˈhʌmdrʌm] *n* 1. mənasızlıq, məzmunsuzluq; 2. cansıxıcı/maraqsız adam və ya şey

**humdrum**[2] [ˈhʌmdrʌm] *adj* mənasız, çürük, boş, çeynənmiş, duzsuz, bayağı, yeknəsəq, cansıxıcı, darıxdırıcı; **to live** ~ **life** mənasız həyat sürmək; **to be engaged in** ~ **tasks** boş/mənasız işlərlə məşğul olmaq

**humerus** [ˈhju:mərəs] *n anat.* bazu sümüyü

**humid** [ˈhju:mɪd] *adj* 1. nəm, nəm çəkmiş, rütubətli, rütubət çəkmiş; 2. *tib.* bəlğəmlə müşayiət olunan

**humidify** [hju:ˈmɪdɪfaɪ] *v* rütubətləndirmək, nəmləndirmək, yaş eləmək, canına nəm çəkdirmək

**humidity** [hju:ˈmɪdɪtɪ] *n* 1. nəmlik, rütubət, nəmişlik, rütubətlilik; 2. nəmlik dərəcəsi *(havanın)*; **relative** ~ nisbi rütubət *(hava haq.)*

**humidor** [ˈhju:mɪdəʳ] *n* havanı nəmləşdirmək üçün qurğu

**humify** [ˈhju:mɪˈfaɪ] *v* I = **humidify**

**humify** [ˈhju:mɪˈfaɪ] *v* II *k.t.* gübrələmək, münbitləşdirmək, qüvvətləndirmək *(torpağı)*

**humiliate** [hju:ˈmɪlɪeɪt] *v* alçaltmaq, hörmətdən salmaq, təhqir etmək; **to** ~ ***smb.'s*** **pride** bir kəsin ləyaqətini alçaltmaq; **a country that was** ~**d by defeat** məğlubiyyətlə ləyaqəti tapdanmış ölkə

**humiliation** [hju:ˌmɪlɪˈeɪʃn] *n* alçaltma, hörmətdən salma, təhqir etmə; biabırçılıq; **the** ~ **of having to surrender** təslim olmanın biabırçılığı

**humility** [hju:ˈmɪlɪtɪ] *n* 1. mütilik, fağırlıq, başıaşağılıq, sadəlik, utancaqlıq; 2. yoxsulluq, kasıblıq; cüzilik, əhəmiyyətsizlik

**hummel** [ˈhʌml] *adj* buynuzsuz, kola; ~ **cow** buynuzsuz / kola inək

**hummer** [ˈhʌməʳ] *n d.d.* 1. çalışqan/fəal adam; 2. vızıldayan böcək; 3. *tex.* zummer *(səs siqnalı verən elektrik cihazı)*

**humming**[1] [ˈhʌmɪŋ] *n* 1. vızıltı, vızıldama; uğuldama; ~ **noise** uğuldayan/vızıldayan səs; 2. *d.d.* qızğın, fəal, işgüzar; ~ **trade** qızğın alver



**humming**[2] [ˈhʌmɪŋ] *adj* 1. vızıldayan; 2. uğuldayan

**humming-bird** [ˈhʌmɪŋbə:d] *n zool.* kolibri, milçəkquşu

**hummock** [ˈhʌmək] *n* 1. təpə; meşə ilə örtülü təpə; 2. qabarıq; bataqlığın içində meşəlik, hündür yer; 3. qum təpəsi; 4. buz qalağı

**hummum** [ˈhʌmʌm] *n* hamam, türk hamamı

**humor** [ˈhju:məʳ] *n amer.* = **humour**

**humorist** [ˈhju:mərɪst] *n* 1. yumorist, yumoristik əsərlər yazan yazıçı; 2. məzhəkəçi / zarafatçı / məzəli / kefcil adam

**humorize** [ˈhju:məraɪz] *v* məzəli danışmaq, zarafatyana sözlər demək, sataşmaq; hazırcavablıq etmək

**humorous** [ˈhju:mərəs] *adj* 1. yumoristik; ~ **writer** yazıçı-yumorist; ~ **story** yumoristik hekayə; *Mark Twain is a humorous writer Mark Tveyn yumorist yazıçıdır*; 2. gülməli, məzhəkəli, komik; ~ **accident** gülməli əhvalat; ~ **situation** gülməli / komik vəziyyət

**humour**[1] [ˈhju:məʳ] *n* 1. yumor; **a story full of** ~ yumorla dolu hekayə; *I don't see much humour in his remarks Mən onun mülahizələrində heç bir incə yumor görmürəm*; **sense of** ~ yumor hissi / duyumu; 2. komizm, məzəlilik, gülünclük, komiklik, məzhəkəlilik; **the** ~ **of his plight** onun vəziyyətinin/durumunun komikliyi/ gülünclüyü; 3. əhval-ruhiyyə, kef, əhval; həvəs, meyl, könül, ovqat; **in a good** ~ yaxşı əhval-ruhiyyədə/ovqatda; **in a bad/ in an ill** ~ pis əhval-ruhiyyədə/ovqatda; **out of** ~ kefi/ovqatı olmama, kefi/ovqatı təlx/pərt olma; **to be in the** ~ **for** ***smth.*** **/to do** ***smth.*** bir şeyi etməyə həvəsi olmaq; *He was not in the humour for work /for working Onun işləməyə könlü/ həvəsi yox idi*

**humour**[2] [ˈhju:məʳ] *v* 1. üz/yol vermək, göz yummaq, mane olmamaq; nazlamaq, əzizləmək, ərköyün böyütmək; **to** ~ **a child** uşağı ərköyün böyütmək; *When a person is ill, he may have to be humoured Adam xəstə olanda onu əzizləmək/nazını çəkmək lazım gəlir*; 2. öyrəşmək, vərdiş etmək

**humourist** [ˈhju:mərɪst] *n* = **humorist**

**humoursome** [ˈhju:məsəm] *adj* şıltaq, şıltaqçı; qəribə, əcaib, ədabaz; qəşəng

**humous** [ˈhju:məs] *adj k.t.* çürüntülü; ~ **soil** çürüntülü torpaq

**hump**[1] [hʌmp] *n* 1. güvən, hörgüc *(dəvədə)*; qoz, donqar *(beldə)*; 2. təpə, təpəlik; dağ silsiləsi, sıra dağlar *(hava yolunda)*; **to fly over the** ~ dağ silsiləsi üzərindən uçub keçmək; 3. çətin məsələ; **to get over the** ~ **of a task** hər hansı bir işdə əsas çətinliklərin öhdəsindən gəlmək; 4. *d.d.* pis əhval-ruhiyyə, ovqat, kef; **to get/to have the** ~ burnunu sallamaq, qəmgin/pərt/məyus olmaq, ruhdan düşmək, ovqatı təlx olmaq

**hump**[2] [hʌmp] *v* 1. belini bükmək /əymək/ qabartmaq; *The cat humped up her back when she saw the dog Pişik iti görəndə belini qabartdı*; 2. beli bükülmək / əyilmək; 3. *d.d.* kefinə soğan doğramaq, kefini pozmaq, ovqatını təlx etmək

**humpback** [ˈhʌmpbæk] *n* = **hunchback**

**hump-backed** [ˈhʌmpbækt] *adj* qozbel, donqar, beli bükülmüş

**humpback salmon** [ˈhʌmpbækˈsæmən] *n* qorbuşa *(qızılbalıqlar fəsiləsindən balıq)*

**humph** [hʌmf, hmf, mm] *int.* hım! mm! *(təraddüd, inamsızlıq ifadə edən nida)*

**humpty-dumpty**[1] [ˈhʌmptɪˈdʌmptɪ] *n* 1. bəstəboy kök adam; 2. pivə və brendi *(konyak)* qarışığından ibarət içki

**humpy** [ˈhʌmpɪ] *n* koma, daxma, dəyə

**humus** [ˈhju:məs] *n* çürüntü, çürümüş peyin

**Hun** [hʌn] *n tar.* 1. hunlar, hun tayfası *(qədim türk tayfası)*; 2. *məc.* barbar, vəhşi

**hunch**[1] [hʌntʃ] *n* 1. qoz, donqar; 2. qalın dilim /fal /tikə /parça; ~ **of cheese** böyük pendir parçası; ~ **of bread** çörək tikəsi/ falı; 3. *amer. d.d.* qabaqcadan hiss etmə, ürəyinə damma, duyma, intuisiya; **on a** ~ intuitiv, intuisiya ilə; **to have a** ~ ürəyinə dammaq, qabaqcadan hiss etmək; *He had a hunch Birdən onun ağlına gəldi/ürəyinə damdı*

**hunch**[2] [hʌntʃ] *v* 1. belini bükmək / əymək /qatlamaq; 2. bükülmək, əyilmək, qatlanmaq; *He sat hunched up O, beli bükülmüş halda oturdu*

**hunchback** [ˈhʌntʃbæk] *n* 1. qoz, donqar; 2. qozbel, donqar *(adam)*

**hundred** [ˈhʌndrəd] *n* 1. yüz *(say)*; a ~ **of** yüz dənə; *A hundred of the apples were rotten Yüz dənə alma çürümüşdü*; **to sell by the** ~ yüz-yüz satmaq; 2. *pl* yüzlərlə, çoxlu; ~**s of people** yüzlərlə adam; 3. yüzlük, yüz funt /sterlinq/dollar; **to lend** ***smb.*** **a** ~ bir kəsə yüz funt/dollar borc vermək; 4. yüz yaş; **to live to be a** ~ yüz yaş/yüz yaşa qədər yaşamaq; 5. düz, tamam, sıfır-sıfır; *We'll meet at nine hundred hours Biz düz saat doqquzda/ doqquz tamamda/doqquz sıfır-sıfırda görüşəcəyik*;

◊ **great/long** ~ yüz iyirmi; **one** ~ **per cent** yüz faiz, tamamilə; a ~ **times**, ~**s of times** yüz /min dəfə; *A hundred to one it will be a failure Şübhəsiz ki, bu, mümkün olan iş deyil. Yəqin ki, bu, baş tutmayacaq*

**hundredfold**[1] [ˈhʌndrədfould] *adj* yüzqat, yüz dəfə; **a** ~ **return on** ***one's*** **money** gəlirin yüz dəfə artması

**hundredfold**[2] [ˈhʌndrədfould] *adv* yüz dəfələrlə; **to increase a** ~ yüz dəfə artmaq

**hundred-per-center** [ˈhʌndrədpəˈsentəʳ] *n amer. d.d.* 1. yüz faiz amerikalı, təmiz amerikalı; 2. geri çəkilməyən adam; 3. yaxşı oğlan/qız

**hundredweight** [ˈhʌndrədweɪt] *n* ingilis sentneri (=50,8 kq); amerikan sentneri (=45,4 kq); *ixtisar forması:* **cwt**

**hung** [hʌŋ] **hang** *felinin pt və pp formaları*

**Hungarian**[1] [hʌŋˈgeərɪən] *n* 1. macar, macarıstanlı; 2. macar dili

**Hungarian²** [hʌŋ'geəriən] *adj* macar, Macarıstana aid

**hunger¹** ['hʌŋgə'] *n* **1.** aclıq, ac qalma; **to die of ~** acından ölmək; **to satisfy *one's* ~ with *smth.*** bir şeylə aclığını öldürmək; *I am dying of hunger Acından ölürəm*; **2.** ehtiyac, tələb, tələbat; **land ~** torpaq sahəsi almağa ehtiyac; *məc.* torpaq ölüsü/ hərisi; **oxygen ~** oksigen aclığı/çatışmazlığı; **3. (for, after)** coşğun həvəs/arzu/ şövq/ehtiras; **~ for adventure** macəra həvəsi/arzusu; **~ for knowledge** biliyə/elmə coşğun həvəs;

◊ *Hunger breaks stone walls at. söz.* ≅ *Ac quluca çapar*

**hunger²** ['hʌŋgə'] *v* **1.** acmaq, ac qalmaq / olmaq, aclıq çəkmək; **2.** acından öldürmək; **3. (into, out of)** aclıqla məcbur etmək *(bir iş görməyə)*; *They hungered the garrison out of the town Onlar qarnizonu acından şəhəri tərk etməyə məcbur etdilər*; **4. (for, after)** çox arzu etmək, həsrətində olmaq, həsrət çəkmək; **to ~ for news** xəbər/müjdə həsrətində olmaq; **to ~ for success** uğur qazanma həsrəti çəkmək

**hunger-march** ['hʌŋgəma:tʃ] *n* aclıq yürüşü *(işsizlərin)*

**hunger-marcher** ['hʌŋgə.ma:tʃə'] *n* aclıq yürüşünün iştirakçısı

**hunger-strike** ['hʌŋgəstraık] *n* aclıq elan etmə *(həbsxanada)*

**hungry** ['hʌŋgrı] *adj* **1.** ac, acmış, boş; **~ stomach** ac/boş qarın; *I am good and hungry Mən bərk acmışam*; **~ children** ac uşaqlar; **to get/to grow ~** acmaq, aclıq hiss etmək; **2.** barsız, bəhrəsiz, bəhərsiz, barsız-bəhərsiz, məhsul verməyən; **~ soil** məhsul verməyən/barsız/bəhərsiz torpaq; **3. (for)** ehtirasla arzu edən, həsrət çəkən, həsrətində olan; **~ for knowledge** elmə / biliyə can atan/həris; **~ for home** ev həsrəti çəkən, ev üçün darıxan; **~ for money** pul ölüsü / hərisi / düşkünü;

◊ **as ~ as a hunter** canavar kimi ac

**hunk¹** [hʌŋk] *n* böyük tikə; dilim, fal, parça

**hunk²** [hʌŋk] *adj amer. d.d.* **1.** salamat, sağ, sağsalamat; **2.** = **hunky-dory**

**hunker** ['hʌŋkə'] *n* cəhalətpərəst, köhnəpərəst, tərəqqi /maarif düşməni

**hunkers** ['hʌŋkəz] *n pl* **1.** sağrı, yan; **on *one's* ~** sağrısı/yanı üstdə; **2.** *məc.* dəhşətli vəziyyətdə

**hunks** [hʌŋks] *n* xəsis, simic, zıqqı

**hunky-dory** [.hʌŋkı'dɔ:rı] *adj amer.d.d.* birinci dərəcəli; ən yaxşı, əla, mükəmməl

**hunt¹** [hʌnt] *n* **1.** ov; ovçuluq; **to have a ~** ova çıxmaq, ov etmək, ovlamaq; **2.** axtarma; **~ for a job** iş axtarma; **to be on the ~ of *smth.*** bir şeyi təkidlə axtarmaq, bir şeyin dalınca düşmək; **to find *smth.* after a long ~** uzun axtarışdan sonra bir şeyi tapmaq; **3.** təqib etmə, dalına düşmə, izləmə, güdmə; **4.** gəmişmə, gəmişdirmə *(tazıları heyvan üzərinə saldırma)*; **5.** it sürüsü ilə ova çıxan süvari ovçu qrupu / dəstəsi; **6.** ov yerləri

**hunt²** [hʌnt] *v* **1.** ovlamaq, ova çıxmaq, ov ovlamaq; ovçuluq etmək; tutmaq; **to ~ a bear** ayı ovlamaq; **to ~ big game** iri quş ovlamaq; **to ~ monkeys with nets** torla meymun tutmaq; **to ~ in packs** sürü ilə ova çıxmaq *(canavar və s. haq.)*; **2.** qovmaq, təqib etmək; qovub çıxarmaq; **3.** *məc.* rədd etmək *(həm də **to ~ away**)*; **to ~ a cat away** pişiyi qovmaq; **to ~ a thief** oğrunu təqib etmək; **to ~ *smb.* from / out of a village** bir kəsi kənddən qovub çıxarmaq; **4.** axtarmaq, özünü ora-bura vurmaq, vurnuxmaq, dolaşmaq, dalınca qaçmaq, arxasınca düşmək; **to ~ for a book** kitab axtarmaq; **to ~ up/out evidence** sübut/dəlil axtarıb tapmaq; **to ~ *smth.* high and low** bir şey üçün yeri-göyü/ hər yeri axtarmaq; **to ~ for an old friend** köhnə dostu axtarmaq; **to ~ down** izləyib tutmaq, təqib edib tutmaq; **to ~ down a criminal** canini izləyib tutmaq;

◊ **to ~ upon the stop** bir şeyi könülsüz / həvəssiz etmək

**hunter** ['hʌntə'] *n* **1.** ovçu; **2.** axtaran, arayan, axtarıcı; **~ after glory** şöhrət axtaran; **3.** ov iti, tazı; **4.** = **hunting watch**;

◊ **hunter's moon** payızda gecə-gündüzün bərabərliyindən sonrakı bədirlənmiş ay / mahtab

**hunter-killer** ['hʌntə.kılə'] *n amer. hərb.* sualtı qayıqları izləyən gəmi

**hunting** ['hʌntıŋ] *n* **1.** ov, ov etmə, ovçuluq; **2.** axtarış; axtarma; axtarılma; **3.** özünü ora-bura vurma, vurnuxma, dolaşma; **4.** *tex.* dəyişkən/qeyri-sabit iş

**hunting-box** ['hʌntıŋbɔks] *n* ovçu koması / daxması

**hunting-cat** ['hʌntıŋkæt] *n zool.* gillik pişiyi, gepard *(ov pələngi)*

**hunting-crop** ['hʌntıŋkrɔp] *n* ov qamçısı

**hunting-dog** ['hʌntıŋdɔg] *n* ov iti

**hunting-field** ['hʌntıŋfi:ld] *n* **1.** ov yerləri; **2.** atlı ovçu dəstəsi / qrupu

**hunting-ground** ['hʌntıŋgraund] *n* ov yerləri;

◊ **happy ~s 1)** cənnət, xoşbəxt axirət dünyası *(amerikan hindularının təsəvvüründə)*; **2)** ovçular cənnəti; ov heyvanları ilə zəngin yer

**hunting-horn** ['hʌntıŋhɔ:n] *n* ov kərənayı / sümsüsü

**hunting-season** ['hʌntıŋ.si:zn] *n* ov mövsümü

**hunting-watch** ['hʌntıŋwɔtʃ] *n* qapaqlı cib saatı

**hunting-whip** ['hʌntıŋwıp] *n* = **hunting-crop**

**huntress** ['hʌntrıs] *n* **1.** ovçu qadın; **2.** ov ilahəsi; **3.** ov madyanı

**huntsman** ['hʌntsmən] *n (pl* **-men** [-men]) **1.** ovçu; **2.** yeger *(ov zamanı itləri idarə edən adam)*; peşəkar ovçu

**huntsmanship** ['hʌntsmənʃıp] *n* **1.** yegerlik, yeger vəzifəsi; **2.** ovçuluq məharəti; ovçuluq sənəti / peşəsi

**hurdle¹** ['hə:dl] *n* **1.** daşına bilən çəpər, hörmə çəpər *(müvəqqəti qoyun küzü / ağılı düzəltmək üçün)*; çubuqdan hörülmüş çəpər; **2.** şax / çırpı döşənək *(bataqlıqdan və s. keçmək üçün körpü)*; **3.** *id.* manеə; **to clear the ~** maneəni aşmaq / dəf etmək; **4.** *məc.* maneənin/çətinliyin öhdəsindən gəlmək



**hurdle²** ['hə:dl] *v* **1.** çəpərləmək, çəpər çəkmək *(həm də **to ~ off/out/round/up**)*; **2.** *id.* maneələri dəf etməklə qaçış yarışında iştirak etmək; maneəni aşmaq/dəf etmək; **3.** *məc.* maneəni aradan qaldırmaq, çətinliyin öhdəsindən gəlmək

**hurdler** ['hə:dlə'] *n id.* **1.** maneə düzəldən; **2.** maneələri dəf etməklə qaçış yarışının iştirakçısı; **3.** maneələri dəf etməklə cıdır yarışında iştirak edən at

**hurdle-race** ['hə:dlreıs] *n id.* **1.** maneələri dəf etməklə qaçış; **2.** *pl* maneələri dəf etməklə cıdır yarışı

**hurdy-gurdy** ['hə:dı.gə:dı] *n* **1.** udabənzər simli musiqi aləti; **2.** çarx üzərində yerləşdirilmiş şarmanka/kiçik orqan

**hurl¹** [hə:l] *n* **1.** tullama, atma, tolazlama; **2.** ağac, toxac *(oyunlarda işlətmək üçün)*, lapta oyununda işlədilən ağac, hokkey ağacı; **3.** girdab, su burulğanı, qıjov

**hurl²** [hə:l] *v* **1.** tolazlamaq, tullamaq; **to ~ a stone** daşı tolazlamaq; *They hurled themselves at/upon the enemy and attacked them violently Onlar özlərini düşmənin üzərinə atıb güclü hücuma keçdilər*; **to ~ javelin** nizə/mizraq / cida atmaq; **2.** devirmək, yıxmaq, atmaq, salmaq; **to ~ *smb.* downstairs** bir kəsi pilləkəndən aşağı atmaq/salmaq; **to ~ down tyranny** istibdad üsuli-idarəsini devirmək; **3.** *məc.* yağdırmaq; **to ~ invectives** lənət/nifrin/ qarğış yağdırmaq; **to ~ abuse at *smb.*** bir kəsə söyüş / təhqir yağdırmaq

**hurley** ['hə:lı] *n* **1.** irland hokkeyi; **2.** irland hokkey ağacı; **3.** irland hokkey topu

**hurly-burly** ['hə:lı.bə:lı] *n* qarışıqlıq, çaxnaşma, araqarışma, hərc-mərclik, qaçhaqaç, mərəkə

**hurrah, hurray** [hu'ra:, hu'reı] *int. Ura!; Hip, hip, hurray!, Hop, hop, ura!; Hurrah for the holidays! Yaşasın tətil!*;

◊ **hurray's nest** *amer.* həngamə, nizamsızlıq, qarışıqlıq, şuluqluq

**hurricane** ['hʌrıkən] *n* **1.** qasırğa, tufan, çox şiddətli külək, tropik siklon; **2.** gurultu, partlayış; **a ~ of applause** gurultulu alqışlar; **~ bombardment** çox şiddətli atəş/atəşə tutma

**hurried** ['hʌrıd] *adj* tələsik, təcili, cəld, ani, *məc.* atüstü, başdansovma, necə gəldi; iti, yeyin, tez; **~ embrace** cəld qucaqlaşma; **~ glance** ani nəzər/baxış; **~ departure** tez-tələsik yola düşmə; **to have ~ meal** atüstü/tələsik/cəld yemək

**hurriedly** ['hʌrıdlı] *adv* tez, tələsik, tələsə-tələsə, tez-tez, tez-tələsik; əlüstü, fövrən, atüstü, ayaqüstü; necə gəldi

**hurry¹** ['hʌrı] *n* tələsmə, qaç-qov, tələskənlik, tələsiklik; **undue ~** lüzumsuz tələsiklik; **in a ~** tez-tələsik, atüstü, tələsik halda; *Why all this hurry?!, Is there any hurry about it? Bu qaç-qov nəyə lazımdır?!; He is in a hurry to leave O getməyə tələsir; Why are you in such a hurry? Nə üçün belə tələsirsən?/tələsirsiniz?*

**hurry²** ['hʌrı] *v* **1.** tələsmək; **to ~ home** evə tələsmək; *Don't hurry! Tələsmə!/Tələsməyin!*; **to ~ after *smth.*** bir şeyin dalınca qaçmaq; **to ~ into *one's* clothes** tez-tələsik geyinmək; **to ~ out of the room** tələsik otaqdan çıxmaq; *He picked up his bag and hurried off O, çantasını götürüb tələsik çıxıb getdi / uzaqlaşdı*; **2.** tələsdirmək, qısnamaq, tezləşdirmək, sürətləndirmək; *It is no use hurrying her Onu tələsdirməyin xeyri yoxdur; It would be a pity to hurry the work İşi başdansovdu etsək, heyf olar; More soldiers were hurried to the front line Daha çox əsgər tələsik cəbhə xəttinə göndərildi; Don't hurry me! Məni tələsdirmə!/ tələsdirməyin!; Hurry him up! Onu tələsdir!/ tələsdirin!*; **to ~ away** tələsik yola düşmək; **to ~ off** tez-tələsik çıxıb getmək; *Hurry up! Tez ol! / olun!, Tələs! / Tələsin!*;

◊ *Hurry no man's cattle Səbrin/Səbriniz olsun*

**hurry-call** ['hʌrıkɔ:l] *n amer.* təcili yardım çağırışı

**hurry-scurry** ['hʌrı'skʌrı] *adv d.d.* təlaş içində, tələsə-tələsə, tez-tələsik, atüstü, ayaqüstü, fikirləşmədən, düşünmədən

**hurt¹** [hə:t] *n* **1.** zərər, ziyan, itki; **~ to *smb.*'s health** bir kəsin səhhətinə ziyan; **to do ~ to *smb.*** bir kəsə ziyan/zərər vurmaq; *What hurt can it do to you? Bu sənə /sizə nə ziyan vura bilər?*; **2.** xəsarət, yara, yaralama, yaralanma, əzmə, zədələmə, əzilmiş yer, kəsik / kəsərti yarası; **to get/to receive a mortal ~** ölümcül yaralanmaq, ölümcül yara almaq; **3.** ağrı; **dull ~** küt ağrı; **4.** incimə, təhqir, təhqir etmə, *məc.* toxunma; *I intended no hurt to his feelings Mən onun könlünü sındırmaq niyyətində deyildim; It was a severe hurt to his pride Bu onun heysiyyətinə/izzəti-nəfsinə ağır zərbə idi, Bu onun mənliyini ciddi təhqir etmək idi*

**hurt²** [hə:t] *v (pt, pp* **hurt) 1.** ağrıtmaq, incitmək, əziyyət vermək; *The plaster won't hurt you Məlhəm sənə/sizə əziyyət verməyəcək; It hurts the eyes to look at the sun Günəşə baxanda adamın gözləri ağrıyır; My shoes hurt me a bit Ayaqqabılarım məni bir az incidir*; **2.** *d.d.* ağrımaq; *My tooth still hurts a little Dişim hələ də bir az ağrıyır*; **3.** zədələmək, yaralamaq, əzmək; *He hurt his back when he fell O yıxılanda belini zədələdi; Did you hurt yourself? Əzilmədin ki, Əzilmədiniz ki?*; **4.** zərər vermək, ziyan vurmaq, toxunmaq; korlamaq; *Don't hurt the flowers! Gülləri korlama!/korlamayın!*; **to ~ *smb.'s* reputation** bir kəsin adını korlamaq; **to ~ *smb.'s* interests** bir kəsin marağına toxun-

maq; *It won't hurt you to read the book Bu kitabı oxusan, ziyan çəkməzsən/çəkməzsiniz;* **5.** *d.d.* zay / xarab olmaq; *The material doesn't hurt if it gets wet Bu material islansa da, zay/xarab olmur; It won't hurt to postpone the matter for a week Bu məsələ bir həftə təxirə salınsa, heç nə olmaz;*

◊ *Nothing hurts like the truth Həqiqət acı olur*

**hurtful** ['hə:tful] *adj* zərərli, ziyanlı, ziyankar, müzür; xətərli, təhlükəli; məhvedici, korlayan, fəlakətli; ~ **to morals** mənəviyyatı korlayan, əxlaq üçün təhlükəli; **to be ~ to the health** səhhət üçün ziyanlı/zərərli olmaq; *Smoking is hurtful to your health Siqaret çəkmək səhhətin / səhhətiniz üçün zərərlidir/ziyanlıdır*

**hurtle** [hə:tl] *v* **1.** sürətlə / çaparaq getmək, yüyürmək; vıyıltı ilə keçmək / uçmaq; **to come hurtling down** vıyıltı ilə yerə düşmək; *During the gale chimney-pots and roof-tiles came hurtling down Qasırğa zamanı buxarı boruları və damların kirəmitləri vıyıltı ilə uçub yerə töküldülər;* **2. (against, together)** toqquşmaq; *The ship was hurtled against the rocks Gəmi qayalara çox bərk toxundu; The car hurtled into the tree Maşın ağaca bərk dəydi*

**hurtleberry** ['hə:tlbəri] *n bot.* qaragilə, mərcanı *(giləmeyvə)*

**husband**[1] ['hʌzbənd] *n* **1.** ər; *He was a good husband to her O ona yaxşı ər idi;* **2.** *arx.* qənaətcil, qənaətkar ailə başçısı; **good/bad ~** yaxşı/pis ailə başçısı;

◊ **~'s tea** açıq və soyuq çay; *A good wife makes a good husband Yaxşı arvadın əri də yaxşı olar*

**husband**[2] ['hʌzbənd] *v* **1.** qənaətlə təsərrüfatı idarə etmək, qənaət etmək, qorumaq; **to ~ one's resources** vəsaitlərdən bacarıqla istifadə etmək; **to ~ one's strength** öz gücünü qoruyub saxlamaq; **to ~ ammunition** döyüş sursatına qənaət etmək; **2.** *d.d. zaraf.* kiməsə ər tapmaq; elçi göndərmək; **3.** ərə getmək; **4.** *arx.* torpaq becərmək, bitki yetişdirmək

**husbandly** ['hʌzbəndlı] *adj* ər-arvad; **~ rights** ər-arvad hüquqları

**husbandman** ['hʌzbəndmən] *n (pl* **-men** [-men]) *arx.* fermer, əkinçi

**husbandry** ['hʌzbəndrı] *n* **1.** əkinçilik, kənd təsərrüfatı; **2.** qənaətcillik, qənaətkarlıq; qənaət; **3. animal ~** maldarlıq; **poultry ~** quşçuluq; **silkworm ~** baramaçılıq

**hush**[1] [hʌʃ] *n* sükut, sakitlik, səssizlik, susma; **in the ~ of night** gecənin sakitliyində; *A hush came/fell over the room Otağa sükut çökdü;*

◊ **on the ~** səssiz-səmirsiz, əlaltından, xəlvəti, gizlicə

**hush**[2] [hʌʃ] *v* **1.** sakitləşdirmək, susmağa məcbur etmək, sakitlik yaratmaq; **to ~ a class** sinifdə sakitlik yaratmaq; *She hushed the baby to sleep O, körpəni sakitləşdirib yatırtdı; The girl hushed him up Qız onu susmağa məcbur etdi; Don't hush me up! Mənim ağzımı yumma! /yummayın!;* **2.** sakitləşmək, rahat olmaq, rahatlaşmaq; *The restless child has finally hushed Narahat uşaq nəhayət ki, sakitləşdi; The wind has hushed Külək sakitləşib;* **3.** *(həm də* **to ~ up)** *məc.* üstünü örtmək, ört-basdır etmək; **to ~ up a scandal** qalmaqalı ört-basdır etmək; *She tried unsuccessfully to hush up the fact that her husband was an ex-convict O, əbəs yerə çalışırdı ki, ərinin keçmişdə məhkum olunma faktını ört-basdır etsin*

**hush**[3] [hʌʃ] *int. Sakit!; Sus!; Sakit olun!*

**hushaby** ['hʌʃəbaı] *int.* lay-lay

**hush-money** ['hʌʃ,mʌnı] *n* susmaq üçün verilən rüşvət

**husk**[1] [hʌsk] *n* **1.** qabıq, toxum qabığı; **rice in the ~** çəltik *(qabıqlı düyü);* qıça *(qarğıdalıda);* **2.** *məc.* yabançı, lazım olmayan bir şey

**husk**[2] [hʌsk] *v* qabığını təmizləmək/almaq, qabıqdan çıxartmaq, qıçasını təmizləmək *(qarğıdalının)*

**husked** [hʌskt] *adj* qabığı təmizlənmiş

**Husky**[1] ['hʌskı] *n* I **1.** eskimos; **2.** eskimos dili

**husky** ['hʌskı] *n* II eskimos laykası *(it)*

**husky**[2] ['hʌskı] *adj* I **1.** qabıqlı; **2.** quru; nahamar; **3.** boğuq, tutqun, xırıltılı, fısıltılı; **~ voice** xırıltılı səs; **~ cough** quru / boğuq öskürək; *You sound husky this morning Bu səhər səsin boğuq çıxır; His voice was husky with anger Hirsindən onun səsi xırıldayırdı*

**husky** ['hʌskı] *adj* II uca, ucaboy, boylu-buxunlu; yekəpər və sağlam; güclü; canıbərk, qıvraq; **a fine ~ woman** gözəl boylu-buxunlu qadın; **~ fellow** yekəpər oğlan

**hussar** [hu'za:] *n* qusar *(macar forması geyən süvari əsgər)*

**hussy** ['hʌsı] *n* **1.** ədəbsiz/diliuzun/həyasız/ təklifsiz qız; **2.** qəhbə; fahişə; gəzəyən qadın

**hustings** ['hʌstıŋz] *n* **1.** Hastinqz *(Londonun baş şəhər məhkəməsi);* **2.** *tar. İngiltərə parlament üzvlərinin seçildiyi yer; 1872-ci ilə qədər parlament üzvlüyünə namizədlərin elan edildiyi və namizədlərin seçicilərə müraciət etdiyi kürsü;* **3.** siyasi və seçkiqabağı çıxışlar üçün kürsü

**hustle**[1] ['hʌsl] *n (ancaq təkdə işlənir)* **1.** basabas, basırıq, tünlük; *The railway station was a scene of hustle and bustle Dəmiryol stansiyasında basabas və çaxnaşma var idi;* **to do smth. with (much) ~** bir şeyi tələş içində/tələsə-tələsə etmək; **2.** *d.d.* qətiyyət, inad; *He is full of hustle O çox qətiyyətlidir/inadkardır*

**hustle**[2] ['hʌsl] *v* **1.** itələmək, dürtmələmək; *The police hustled the thief into their van Polis oğrunu dürtmələyib həbsxana maşınına saldı; She was hustled in the crowd İzdihamın içində onu itələyib/dürtmələyib əldən saldılar; They were hustled out of yard Onları itələyib həyətdən qovdular;* **2.** bir-birini sıxmaq / itələmək; doluşmaq; **3. (through, onto, out of)** soxulmaq, girmək, keçmək; itələyə-itələyə soxulmaq / girmək; **to ~ into a bus** avtobusa soxulmaq; *He hustled through the crowded streets O, izdihamlı küçələrdən adamları itələyə-itələyə keçib getdi;* **4. (against)** üstünə / qarşısına çıxmaq, toqquşmaq; rast gəlmək; **to ~ against smb.** bir kəslə toqquşmaq, bir kəsə rast gəlmək; **5.** məcbur/vadar etmək; *I don't want to hustle you into a decision Mən istəmirəm ki, səni/sizi bir qərara gəlməyə vadar edim;* **6.** *amer.* qəhbəliklə/ fahişəliklə məşğul olmaq, qəhbəlik/ fahişəlik etmək



**hustler** ['hʌslə$^r$] *n* **1.** çalışqan/fəal adam; **2.** *amer.* qəhbə, fahişə; **3.** cibgir, cibkəsən *(oğru)*

**hut**[1] [hʌt] *n* koma, daxma, dəyə

**hut**[2] [hʌt] *v* **1.** mənzil vermək, barakda yerləşdirmək; **2.** barakda / komada yaşamaq

**hutch** [hʌtʃ] *n* **1.** sandıq; **2.** dovşan üçün qəfəs; **3.** *d.d.* koma, daxma, barak; daqqa; **4.** *tex.* bunker

**hutment** ['hʌtmənt] *n* bir neçə komadan ibarət kənd/aul

**hyacinth** ['haıəsınθ] *n* **1.** *bot.* giasint, sünbülçiçəyi; **2.** giasint *(mineral, qiymətli daş)*

**hyaena** [haı'ı:nə] *n* = **hyena**

**hyaline** ['haıəlın] *adj şair.* şəffaf, büllur kimi təmiz, tərtəmiz, gözgü kimi

**hybrid**[1] ['haıbrıd] *n* hibrid, meləz *(bitki, heyvan və s.)*

**hybrid**[2] ['haıbrıd] *adj* hibrid, meləz; *A mule is a hybrid animal Qatır meləz heyvandır;* **~ languages** hibrid dilləri *"Cablegram" is a hybrid; half the word is Latin and half is Greek "Cablegram" hibrid sözdür; yarısı latın, yarısı isə yunan sözüdür*

**hybridize** ['haıbrıdaız] *v* **1.** hibridləşdirmək; **2.** hibridləşmək

**hydra** ['haıdrə] *n əs.* **1.** əjdaha; **2.** şər qüvvə

**hydrant** ['haıdrənt] *n* hidrant *(su kəməri kranı);* **fire ~** yanğın hidrantı

**hydrate** ['haıdreıt] *n kim.* hidrat; **~ of lime** sönmüş əhəng; **~ sodium** kaustik soda

**hydraulic** [haı'drɔ:lık] *adj* **1.** hidravlik; hidrotexniki; **~ brake** hidravlik əyləc; **~ lift** hidravlik lift; **2.** suda bərkiyən; **~ cement** hidravlik sement

**hydraulics** [haı'drɔ:lıks] *n* hidravlika

**hydroacoustics** ['haıdrouə'ku:stıks] *n* hidroakustika *(suda səsin yayılmasını öyrənən elm)*

**hydrocarbon** ['haıdrə'ka:bən] *n kim.* karbohidrogen *(benzin, parafin və s.)*

**hydrochloric** ['haıdrə'klɔrık] *adj kim.* **~ acid** xlorid turşusu

**hydroelectric** ['haıdrouı'lektrık] *adj* hidroelektrik, su elektrik; **~ generator** hidroturbogenerator; **~ plant** su elektrik stansiyası

**hydrogen** ['haıdrıdʒən] *n kim.* hidrogen; **heavy ~** ağır hidrogen

**hydrogen bomb** ['haıdrıdʒən'bɔm] *n* hidrogen bombası

**hydrogenous** [haı'drɔdʒınəs] *adj* hidrogenli, tərkibində hidrogen olan

**hydrography** [haı'drɔgrəfı] *n* hidroqrafiya

**hydrology** [haı'drɔlədʒı] *n* hidrologiya

**hydrolysis** [haı'drɔlısıs] *n (pl* **-ses** [-si:z]) *kim.* hidroliz

**hydromechanics** ['haıdroumı'kænıks] *n* hidromexanika

**hydrometer** [haı'drɔmıtə$^r$] *n* **1.** hidrometr, suölçən; **2.** *fiz.* areometr; **~ for spirits** spirtomer *(mayedə spirtin miqdarını göstərən cihaz)*

**hydropathy** ['haıdrɔpəθı] *n tib.* su müalicəsi, su ilə müalicə

**hydrophobia** [,haıdrə'foubjə] *n tib.* hidrofobiya, quduzluq, sudan qorxma xəstəliyi

**hydrophone** ['haıdrəfoun] *n* hidrofon

**hydrophyte** ['haıdrəfaıt] *n bot.* hidrofit *(su bitkisi)*

**hydropic** [haı'drɔpık] *adj tib.* **1.** hidroposlu, şiş; **2.** vadyanka / hidropos xəstəliyindən əziyyət çəkən

**hydroplane** ['haıdroupleın] *n dən.* qlisser *(yastıdibli itigedən qayıq)*

**hydropsy** ['haıdrɔpsı] *n tib.* vadyanka, hidropos *(bədən boşluqlarına su yığılması xəstəliyi)*

**hyena** [haı'ı:nə] *n zool.* kaftar, göreşən

**hygiene** ['haıdʒı:n] *n* gigiyena

**hygienic** [haı'dʒi:nık] *adj* gigiyenaya əsaslanan, gigiyena, səhiyyə; **~ conditions** gigiyena şəraiti

**hygienist** ['haıdʒı:nıst] *n* gigiyena mütəxəssisi

**hygrometer** [haı'grɔmıtə$^r$] *n* hiqrometr *(havanın rütubətini ölçən cizah)*

**hygroscope** ['haıgrəskoup] *n* hiqroskop *(havanın rütubət dərəcəsini göstərən cihaz)*

**hygroscopic** [,haıgrəs'kɔpık] *adj* hiqroskopik, nəmçəkən, rütubəti özünə çəkən

**Hymen** ['haımən] *n* **1.** Himeney *(qədim Yunanıstanda nikah allahı);* **2.** nikah; toy; **3.** qədim Yunanıstanda toy mahnısı

**hymen** ['haımən] *n anat.* qızlıq/bakirəlik pərdəsi

**hymenal** ['haımınl] *adj anat.* qızlıq pərdəsinə aid

**hymenotomy** [,haımı'nɔtəmı] *n tib.* qızlıq pərdəsinin kəsilməsi

**hymn**[1] [hım] *n* **1.** *din.* kilsə himni; allaha mədhiyyə; zəbur surəsi; **2.** mədh, mədh etmə; himn

**hymn**[2] [hım] *v* mədh/tərif etmək, himn oxumaq

**hymnal**[1] ['hımnəl] *n din.* məzamir, zəbur kitabı

**hymnal**[2] ['hımnəl] *adj din.* kilsə himnlərinə aid, məzamirə / zəbur kitabına aid

**hymn-book** ['hımbuk] *n din.* zəbur kitabı, məzamir *(dini kitab)*

**hymnist** ['hımnıst] *n din.* zəburçu, zəbur oxuyan

**hyperbola** [haı'pə:bələ] *n riyaz.* hiperbola *(konusun oxuna paralel kəsiklərdən biri)*

**hyperbole** [haı'pə:bəlı] *n üslub.* mübaliğə; *(məs.* **waves as high as Everest** Everest dağı hündürlükdə dalğalar)

**hyperbolic, hiperbolical** [ˌhaɪpəˈbɔlɪk, -əl] *adj* **1.** *üslub.* hiperbolik, mübaliğəli; **2.** *riyaz.* hiperbolik
**hypercritical** [ˌhaɪpəˈkrɪtɪkəl] *adj* çox ciddi, yersiz / hər şeyə irad tutan, bəhanə axtaran
**hypermarket** [ˈhaɪpəma:kɪt] *n* nəhəng supermarket
**hyphen** [ˈhaɪfn] *n* **1.** defis, birləşdirici xətt; **2.** *mürəkkəb sözlərin arasında və ya söz hecalarını sətirdən sətrə keçirəndə onların arasında qoyulan kiçik xətt; (məs. Anglo-French, hunt-ing-crop və s.)*
**hyphenate** [ˈhaɪfneɪt] *v* defislə yazmaq
**hyphenated** [ˈhaɪfneɪtɪd] *adj* defislə yazılan, *It is a hyphenated word Bu söz defislə yazılır;*
◊ ~ **Americans** ABŞ-da doğulmamış amerikalılar *(məs.* **German-Americans** alman mənşəli amerikanlılar)
**hypnosis** [hɪpˈnousɪs] *n (pl* **-ses** [-si:z]) hipnoz
**hypnotic**[1] [hɪpˈnɔtɪk] *n* **1.** asan hipnoz vəziyyətinə düşmə; **2.** hipnoz edilmiş adam; **3.** yuxugətirən dərman
**hypnotic**[2] [hɪpˈnɔtɪk] *adj* **1.** hipnoz, hipnozla bağlı; **2.** yuxugətirən, narkotik
**hypnotism** [ˈhɪpnətɪzm] *n* hipnotizm *(hipnoz elmi; hipnoz hadisələri)*
**hypnotist** [ˈhɪpnətɪst] *n* hipnozçu
**hypnotization** [ˌhɪpnətaɪˈzeɪʃn] *n* **1.** hipnoz etmə; **2.** hipnoz vəziyyəti
**hypnotize** [ˈhɪpnətaɪz] *v* hipnoz etmək; hipnoz vasitəsilə yatırtmaq
**hypnotizer** [ˈhɪpnətaɪzəʳ] *n* = **hypnotist**
**hypo** [ˈhaɪpou] *n fot.* fiksaj *(fotoqrafiyada işlədilən kimyəvi məhlul*
**hypochondria** [ˌhaɪpouˈkɔndrɪə] *n* hipoxondriya, ruh düşkünlüyü
**hypochondriac** [ˌhaɪpouˈkɔndrɪæk] *adj tib.* hipoxondrik *(hipoxondriya xəstəliyinə tutulmuş)*
**hypocrisy** [hɪˈpɔkrəsɪ] *n* ikiüzlülük, riyakarlıq
**hypocrite** [ˈhɪpəkrɪt] *n* ikiüzlü, riyakar; riyakar, yalançı mömin *(adam)*
**hypocritical** [ˌhɪpəˈkrɪtɪkəl] *adj* ikiüzlü, riyakar
**hypocritically** [ˌhɪpəˈkrɪtɪkəlɪ] *adv* riyakarcasına
**hypodermic** [ˌhaɪpəˈdə:mɪk] *adj* **1.** dərialtı; ~ **injection** dərialtı inyeksiya *(dərman yeritmə)*; ~ **needle** dəri altına dərman yeritmək üçün iynə; **2.** dəri altına yeridilən *(dərmanlar)*
**hypotenuse** [ˌhaɪˈpɔtɪnju:z] *n* hipotenuza *(düzbucaqlı üçbucaqda düz bucaq qarşısındakı tərəf)*
**hypothecate** [haɪˈpɔθɪkeɪt] *v* **1.** mülkü girov qoymaq; **2.** girov müqabilində borc almaq
**hypothesis** [haɪˈpɔθɪsɪs] *n (pl* **-ses** [-si:z]) hipoteza, fərziyyə, ehtimal, güman, təxmin
**hypothetical** [ˌhaɪpouˈθetɪkl] *adj* hipotetik, fərziyyəyə/ehtimala əsaslanan
**hyson** [ˈhaɪsn] *n yaşıl Çin çayının bir növü*
**hy-spy** [ˈhaɪˈspaɪ] *n* gizlənpaç oyununu xatırladan uşaq oyunu
**hysteria** [hɪsˈtɪərɪə] *n* isteriya *(həddindən artıq qıcıqlanma, bəzən ürəkkeçmə şəklində təzahür edən əsəb xəstəliyi)*
**hysterical** [hɪsˈterɪkl] *adj* isterik, əsəbi; ~ **laughter** isterik / əsəbi gülüş
**hysterics** [hɪsˈterɪks] *n* isterika; isteriya xəstəliyi nəticəsində ürəkkeçmə; müvazinətini itirmə, hal-təbdən çıxma



# I i

**I i** [aɪ] *n (pl* **I's, i's** [aɪ:z]) *ingilis əlifbasının 9-cu hərfi;*
◊ **to dot the i's (and cross the t's)** ≅ məsələni bir dəfəlik həll edib qurtarmaq
**I** [aɪ] *pers. pron.* mən; *I am a teacher Mən müəllimən; He and I are great friends Mən onunla bərk dostam; It's I Mənəm;*
◊ *I say 1) Bura bax!/baxın!, Qulaq as! /asın!; I say, do come and sit near me! Bura bax!/baxın! Gəl/Gəlin mənim yanımda otur!/oturun!; I say Why do you dislike me? Qulaq as!/asın! Sənin / Sizin nə üçün məndən xoşun/xoşunuz gəlmir?*
**-i** [-aɪ, -ɪ] *suff Bəzi alınma termin xarakterli sözlərin cəm formasını düzəltmək üçün işlədilir:* cirrus *cəmdə* **cirri**; nucleus *cəmdə* **neclei**; dilettante *cəmdə* **dilettanti**
**iamb** [ˈaɪæm, ˈaɪæmb] *n* I = **iambus**
**iamb** [ˈaɪæm, ˈaɪæmb] *n* II **iambus** *sözünün cəm forması*
**iambic**[1] [aɪˈæmbɪk] *n (adət. pl)* yamb, yamb üslubunda yazılmış şer; **to write in ~s** yamb üsulunda şer yazmaq
**iambic**[2] [aɪˈæmbɪk] *adj* yamb formasında yazılmış; ~ **verse** yamb formasında yazılmış şer
**iambist** [aɪˈæmbɪst] *n* yamb formasında şer yazan müəllif
**iambus** [aɪˈæmbəs] *n (pl həm də* [-bɪ]) yamb *(vurğusu ikinci hecada olan ikihecalı şer vəzni)*
**Iberian**[1] [aɪˈbɪərɪən] *n* **1.** iber *(qədim İspaniyada və Gürcüstanın şərq hissəsində yaşayan qəbilə qrupları)*; **2.** qədim iberlərin dili
**Iberian**[2] [aɪˈbɪərɪən] *n* Iberiya, iber, iberlərə aid olan; **the ~ language** iber dili
**ibex** [ˈaɪbeks] *n zool. (pl* **ibices**) dağ keçisi
**ibices** [aɪbɪsi:z] *n* **ibex** *isminin cəm forması*
**ibis** [ˈaɪbɪs] *n (pl* **ibides**, *həm də* **ibes**) *zool.* qaraleylək *(leyləklər fəsiləsindən iri quş)*
**-ible** [-əbl, -ɪbl] *suff.* = **-able**
**-ic** [-ɪk] *suff. Isimlərdən termin xarakterli nisbi sifətlər düzəltmək üçün işlədilir: məs.:* **atomic** atom; **carbonic** kömür; **volcanic** vulkanik; **climatic** iqlim; **domestic** ev; **dramatic** dramatik; **symphonic** simfonik və s.
**-ical** [-ɪkl] *suff. Sifət düzəltmək üçün işlədilir:* **logical** məntiqi; **classical** klassik; **historical** tarixi *(tarixə aid olan)* və s.
**ice**[1] [aɪs] *n* **1.** buz; **dead ~** tərpənməyən/hərəkətsiz buzlaq; **eternal ~** əbədi buz; **floating ~** üzən buz; **open ~** seyrək buz; **a block of ~** buz parçası/kütləsi; **a sheet of ~** buz örtüyü; **a piece of ~** bir parça buz; **to turn into ~** buza dönmək, buz bağlamaq; buza döndərmək; *Terror turned his heart into ice Dəhşət onun qəlbini buza döndərdi*; **to feel as cold as ~** buz kimi hiss etmək; **to be made of ~** buz kimi soyuq olmaq; *She is all ice to me Onun mənə münasibəti buz kimi soyuqdur*; **2.** *pl* dondurma; **two strawberry ~s** iki pay çiyələkli dondurma; *Children like ices Uşaqlar dondurmanı xoşlayırlar;*
◊ **straight off the ~ 1)** təzə, tər, yenicə alınmış *(azuqə, ərzaq haq.)*; **2)** dərhal, yubanmadan; **on thin ~** təhlükə qarşısında, təhlükəli vəziyyətdə; **to skate/to walk on thin ~** uçurumun qırağı ilə yerimək, təhlükə qarşısında qalmaq; ≅ odla oynamaq; **to break the ~** buzu sındırmaq, sakitliyi pozmaq, ilk addım atmaq, bir işi başlamaq
**ice**[2] [aɪs] *v* **1.** buzla örtmək *(həm də ~* **up**, *~* **over**); *The pond was iced over Nohur buzla örtülmüşdü*; **2.** *(həm də ~* **up**) dondurmaq, donmaq, buz bağlamaq; *The water has iced overnight Su gecə buz bağlayıb/donub*; **3.** soyutmaq; **to ~ water/ coffee/tea** suyu/kofeni/çayı soyutmaq; **4.** şirələmək; **to ~ a cake** tortu şirələmək
**-ice** [ɪs] *suff. Bəzi isimlərin düzəldilməsində işlənir: məs.:* **justice** ədalət; **cowardice** qorxaqlıq; **notice** bildiriş və s.
**ice-age** [ˈaɪsˈeɪdʒ] *n* buz dövrü
**ice-axe** [ˈaɪsæks] *n* buz baltası *(alpinistlərdə)*
**iceberg** [ˈaɪsbə:g] *n* aysberq, buzdağı
**ice-bird** [ˈaɪsbə:d] *n* şimal quşu, şimal bölgələrində yaşayan quş
**ice-boat** [ˈaɪsbout] *n dən.* buzqıran *(gəmi)*
**ice-bound** [ˈaɪsbaund] *adj* buzla əhatə olunmuş, buz bağlamış, buzla örtülmüş
**ice-box** [ˈaɪsbɔks] *n* **1.** soyuducu; **2.** buzxana
**ice-breaker** [ˈaɪsˌbreɪkəʳ] *n* buzqıran gəmi
**ice-cap** [ˈaɪskæp] *n* **1.** *geol.* buz örtüyü; **2.** qütb buzu, mərkəzi Arktikanın buzu; **3.** *tib.* içində buz olan qovuq *(başağrısı zamanı başa qoyulan)*
**ice-cold** [ˈaɪskould] *adj* çox soyuq, buz kimi; ~ **drinks** buz kimi içkilər
**ice-cream** [ˈaɪskri:m] *n* qaymaqlı dondurma
**ice-cube** [ˈaɪskju:b] *n* içkiləri sərinlətmək üçün kubvarı buz parçası
**ice-dance** [ˈaɪsda:ns] *n* **1.** buz üzərində rəqs; **2.** buz üzərində balet
**ice-fall** [aɪsfɔ:l] *n* sıldırım buzlağı
**ice-field** [ˈaɪsfi:ld] *n* buz meydanı, başdan-başa buz olan sahə
**ice-floe** [ˈaɪsflou] *n* üzən buzlaq *(xüs. dənizdə)*: *In spring the ice-floes break up Yazda buzlaq sınır*
**ice-fox** [ˈaɪsfɔks] *n zool.* şimal tülküsü
**ice-gull** [ˈaɪsgʌl] *n zool.* ağ qağayı, şimal qağayısı

**ice-hockey** [ˈaɪs:hɔkɪ] *n id.* buz üzərində hokkey
**ice-house** [ˈaɪshaus] *n* **1.** buzxana, buz anbarı; **2.** buz kimi daxma / ev
**Iceland** [ˈaɪslənd] *n* İslandiya, əbədi buzla örtülmüş ölkə
**Icelander** [ˈaɪsləndəʳ] *n* islandiyalı; **the ~s** *top.i* islandiyalılar
**Icelandic**[1] [aɪsˈlændɪk] *n* islandiya dili
**Icelandic**[2] [aɪsˈlændɪk] *adj* Islandiya; **the ~ language** İslandiya dili
**iceman** [ˈaɪsmæn] *n (pl* **-men** [-men]) **1.** arktik səyyah; **2.** alpinist; **3.** *amer.* buzdaşıyan, buz satan; **4.** dondurmaçı, dondurma satan
**ice-pack** [ˈaɪspæk] *n* içi buzla doldurulmuş torba *(bədəndə əzilmiş yerin şişməsinin qarşısını almaq üçün)*
**ice-pick** [ˈaɪspɪk] *n* buz kərkisi / baltası
**ice-rink** [ˈaɪsrɪŋk] *n* buz meydançası *(adət. üstüörtülü; hokkey və s. oynamaq üçün)*
**ice-saw** [ˈaɪssɔ:] *n* buz kəsmək üçün mişar
**ice-shoe** [ˈaɪsʃu:] *n (adət. pl)* buz üstündə gəzmək üçün altında çıxıntı olan botinka
**ice-water** [ˈaɪswɔ:təʳ] *n* buzlu su
**ice-whale** [ˈaɪsweɪl] *n* qütb balinası
**icicle** [ˈaɪsɪkl] *n* buz lüləsi / salxımı, sırsıra
**icicled** [ˈaɪsɪkld] *adj* buz lüləsi ilə örtülmüş
**icily** [ˈaɪsɪlɪ] *adv* **1.** çox soyuq, iliyə/sümüyə işləyən; *The wind blew icily İliyə/Sümüyə işləyən külək əsirdi;* **2.** soyuq; nifrətlə; **to look/to glance/to stare ~ at *smb.*** bir kəsə nifrətlə /kin-li-kinli baxmaq
**iciness** [ˈaɪsɪnɪs] *n* **1.** bərk soyuq / şaxta; **2.** soyuqluq
**icing** [ˈaɪsɪŋ] *n* I **1.** şəkər, yumurta ağı və s.-dən hazırlanmış qatışıq *(pirojnanı bəzəmək və üstünə çəkmək üçün)*; **chocolate ~** şokoladlı şirə; **2.** şirələmə, minalama; **3.** dondurma
**icing** [ˈaɪsɪŋ] *n* II aysinq *(hokkey oyununda: şaybanı öz meydançasından birbaşa rəqib meydançasına atma)*
**icon** [ˈaɪkən] *n* **1.** ikona *(xristianlarda allahın və ya övliyaların şəkli)*; **2.** estamp *(qravüradan çıxarılmış nüsxə)*, qravüra; illüstrasiya *(bədii ədəbiyyatda)*; **3.** *d.d.* şəkil, portret; heykəl; **4.** işarə, rəmz, simvol
**iconic** [aɪˈkɔnɪk] *adj* **1.** ikonaya aid olan; **2.** portret, şəkil; **3.** kilsə qaydalarilə müəyyən edilmiş; qanun-qaydaya uyğun
**iconoclasm** [aɪˈkɔnəklæzm] *n* **1.** *din.* ikonoborculuq *(VIII-IX əsrlərdə Vizantiyada meydana çıxmış, ikonolara sitayiş etməyə zidd olan dini cərəyan)*; **2.** ənənəvi xurafata / mövhumata qarşı mübarizə
**iconoclast** [aɪˈkɔnəklæst] *n* **1.** ikonoborçu; **2.** buntçu, qiyamçı, üsyankar *(adam)*
**-ics** [-ɪks] *suff.* **1.** *Bir sıra elm adlarında işlədilir: məs.:* mathematics riyaziyyat; physics fizika; phonetics fonetika; **2.** *Bəzi idman terminlərində təsadüf edilir:* gymnastics gimnastika; athletics atletika

**icy** [ˈaɪsɪ] *adj* **1.** buz kimi, çox soyuq; **~ air** çox soyuq hava; *It's icy cold today Bu gün buz kimi soyuqdur / çox soyuqdur;* **2.** sürüşkən; **3.** buz kimi; soyuq; **~ look / stare** soyuq baxış; **~ reception** soyuq qəbul; **4.** buzla örtülü; **~ mountains** əbədi olaraq buzla örtülmüş dağlar
**idea** [aɪˈdɪə] *n* **1.** ideya, fikir; **abstract ~s** mücərrəd ideyalar/fikirlər; **basic/essential/fundamental ~** əsas ideya / fikir; **dominant / reigning / prevalent ~s** hakim ideyalar; **capital ~** əla ideya/fikir; *I've got an idea of writing a new book Mənim yeni kitab yazmaq fikrim var; He'll have his own ideas about this Bu barədə onun öz fikirləri olacaq;* **2.** təsəvvür, anlayış; **clear/distinct ~** aydın/dəqiq təsəvvür; **complete/confused ~** kamil/dolaşıq təsəvvür; *I've got a good idea of what he wants Onun nə istədiyi barədə mənim yaxşı təsəvvürüm var;* **general ~** ümumi təsəvvür; **the ~ of beauty** gözəllik haqqında təsəvvür; **to have an ~ of *smth.*** bir şey haqqında təsəvvürü olmaq; **to get an ~ of *smth.*** bir şey haqqında təsəvvür əldə etmək; **to have no ~/not the faintest ~ of *smth.*** bir şey haqqında əsla/qətiyyən təsəvvürü olmamaq; *I had no idea he would do that Mən təsəvvür edə bilməzdim ki, o bunu edəcək;* **3.** plan, niyyət, məram, məqsəd, qərəz; **impracticable ~** həyata keçirilməsi müşkül/ qeyri-mümkün olan niyyət; *My idea is to close the door and open the window Mənim fikrim/məqsədim qapını bağlamaq və pəncərəni açmaqdır; He went to London with the idea of seeing historical places O, Londona tarixi yerləri görmək məqsədilə / niyyətilə getdi;*
◊ **the young ~** uşaq ağlı; *What's the big idea? Bunun əsas mənası nədir? Bu bütünlükdə nə deməkdir?; That's the idea! Bax əsas məsələ budur!*
**ideal**[1] [aɪˈdɪəl] *n* ideal *(ən yaxşı / gözəl nümunə)*; **an ~ of happiness / of comfort** xoşbəxtliyin/rahatlığın idealı; **an ~ of conduct** davranışın ən gözəl nümunəsi; **to realize *one's* ~s** öz ideallarını həyata keçirmək; **to form ~s** ideallar yaratmaq/ formalaşdırmaq; *He's the very ideal of a friend O, dostluğun idealıdır*
**ideal**[2] [aɪˈdɪəl] *adj* **1.** ideal, bitkin, kamil, əla; **~ companion** əla kompanyon/yoldaş; **~ gift** əla hədiyyə; **~ weather** ideal/ əla hava; **~ weather for a swim** üzmək/çimmək üçün ideal/əla hava; **an ~ place for a holiday** istirahət üçün əla yer; **2.** təsəvvür edilən, mücərrəd, xəyali; **~ happiness** xəyali xoşbəxtlik; **3.** qeyri-real; həyata keçirilə bilməyən; **~ plans** qeyri-real planlar; **4.** *fəls.* idealist
**idealism** [aɪˈdɪəlɪzm] *n* **1.** *fəls.* idealizm; **2.** ideallaşdırma, idealist yanaşma
**idealist**[1] [aɪˈdɪəlɪst] *n* **1.** *fəls.* idealist, idealizm tərəfdarı; **2.** *kin.* xəyalpərəst, xülyaçı *(adam)*
**idealist**[2] [aɪˈdɪəlɪst] *adj* = **idealistic**
**idealistic** [aɪˈdɪəlɪstɪk] *adj* idealistik; **~ viewpoint** idealist dünyagörüşü / baxış



**ideality** [ˌaɪdɪˈælɪtɪ] *n* **1.** ideallıq, əlalıq, mükəmməllik; **2.** *pl* təsəvvür olunan, qeyri-real
**idealisation** [aɪˌdɪəlaɪˈzeɪʃn] *n* = **idealization**
**idealization** [aɪˌdɪəlaɪˈzeɪʃn] *n* ideallaşdırma, idealizə etmə *(həqiqətdə olduğundan daha yaxşı göstərmə)*
**idealise** [aɪˈdɪəlaɪz] *v* = **idealize**
**idealize** [aɪˈdɪəlaɪz] *v* **1.** ideallaşdırmaq, idealizə etmək *(həqiqətdə olduğundan daha yaxşı göstərmək)*; **2.** idealist fikrə tərəfdar çıxmaq / olmaq
**ideally** [aɪˈdɪəlɪ] *adv* **1.** fikrən, xəyalən, mücərrəd, mücərrəd bir tərzdə; **2.** əla, ən gözəl, çox yaxşı; mükəmməl, olduqca yaxşı
**identical** [aɪˈdentɪkl] *adj* **1.** həmin; **an ~ room/street/town, etc.** həmin otaq/küçə / şəhər və s.; *This is the identical room we stayed last year Bu bizim keçən il qaldığımız həmin otaqdır;* **2. (to, with)** eyni, oxşar; **~ clothes /reply/problem** eyni paltar/cavab/problem; *They're wearing identical clothes Onlar eyni/oxşar paltar geyirlər; Your answer is identical with mine Sənin/Sizin cavabın/cavabınız mənimki ilə eynidir; This picture is identical to one my mother has Bu şəkil mənim anamda olan şəklin eynidir*
**identically** [aɪdentɪklɪ] *adv* eyni, oxşar, eynilə, eyni tərzdə
**identification**[1] [aɪˌdentɪfɪˈkeɪʃn] *n* **1.** tanıma, tanınma; müəyyən etmə; əsli olduğunu müəyyənləşdirmə; *The identification of the accident victims took some time Qəzanın qurbanlarının tanınması bir müddət vaxt aldı;* **2.** təyin etmə, aydınlaşdırma, aydın etmə, müəyyənləşdirmə
**identification**[2] [aɪˌdentɪfɪˈkeɪʃn] *adj* fərqləndirici; **~ card** şəxsiyyəti bildirən vəsiqə/şəhadətnamə; **~ disk** *hərb.* şəxsi işarə; **~ mark** *hərb.* fərqləndirici nişan *(təyyarədə, maşında və s.)*; **~ prisoner** *hərb.* "dil *(düşmən haqqında məlumat alına biləcək əsir)*
**identify** [aɪˈdentɪfaɪ] *v (pt, pp* **-fied) 1.** eyniləşdirmək, oxşar olduğunu müəyyən etmək; **to ~ wealth with happiness** var-dövləti xoşbəxtliklə eyniləşdirmək; *One should not identify wealth with happiness Var-dövləti xoşbəxtliklə eyniləşdirmək olmaz;* **2.** müəyyənləşdirmək, müəyyən etmək; tanımaq; *The age of a horse can be identified by its teeth Atın yaşı onun dişlərilə müəyyənləşdirilə bilər; Can you identify your umbrella among these? Bunlar arasında sən/siz öz çətirini/ çətirinizi tanıya bilərsənmi?/ bilərsinizmi?;* **to ~ by the map** xəritə vasitəsilə müəyyən etmək; **to ~ a person/ a corpse** şəxsi /meyiti tanımaq; **to ~ a prisoner** dustağın şəxsiyyətini müəyyənləşdirmək; **3. (oneself)** özünü təqdim etmək, şəxsi vəsiqə göstərmək; **4. (with)** eyniləşdirmək; tam həmrəy olmaq; **to ~ *one's* interests with those of another** öz marağını özgəsinin marağı ilə eyniləşdirmək; **to ~ oneself with *smb.'s* view** bir kəsin fikri ilə tam həmrəy olmaq; *He identifies with the majority O, çoxluqla həmrəydir/həmfikirdir;* **5.** uyğun gəlmək / olmaq, üst-üstə düşmək; *Their tastes always identify Onların zövqləri həmişə uyğun gəlir / üst-üstə düşür*
**identity**[1] [aɪˈdentɪtɪ] *n* **1.** eyniyyət, eynilik, oxşarlıq, bənzərlik, oxşayış; **2.** həqiqilik, doğruluq; **proofs of ~** həqiqəti müəyyən edən dəlillər; **3.** şəxsiyyət; **to prove *smb.'s* ~** bir kəsin şəxsiyyətini sübut etmək; **to recognize *smb.'s* ~** bir kəsin şəxsiyyətini tanımaq; **4.** *riyaz.* bərabərlik
**identity**[2] [aɪˈdentɪtɪ] *adj:* **~ card** şəxsi vəsiqə, şəxsiyyəti sübut edən sənəd; **~ number** *hərb.* şəxsi nömrə
**ideogram** [ˈɪdɪəgræm] *n* = **ideograph**
**ideograph** [ˈɪdɪougra:f] *n* **1.** *dilç.* ideoqram *(hər hansı bir anlayışı ifadə edən şərti işarə)*; **2.** nişan, simvol, rəmz, işarə
**ideographic** [ˌɪdɪouˈgræfɪk] *adj* ideoqrafik
**ideographical** [ˌɪdɪouˈgræfɪkl] *adj* = **ideographic**
**ideography** [ˌɪdɪˈɔgrəfɪ] *n dilç.* ideoqrafiya *(hərflərlə deyil, ideoqramlar vasitəsilə yazma)*
**ideologic** [ˌaɪdɪˈɔlədʒɪk] *adj* = **ideological**
**ideological** [ˌaɪdɪəˈlɔdʒɪkl] *adj* ideoloji, məfkurəvi; **~ differences** ideoloji/məfkurəvi fərqlər; **~ arguments** ideoloji dəlillər / sübutlar
**ideologist** [ˌaɪdɪˈɔlədʒɪst] *n* **1.** ideoloq; **2.** həyatdan uzaq düşmüş nəzəriyyəçi; boş xəyalpərəst / xülyaçı
**ideologue** [ˌaɪdɪˈɔləg] *n* = **ideologist**
**ideology** [ˌaɪdɪˈɔlədʒɪ] *n* **1.** ideologiya, məfkurə; **bourgeois ~** burjua ideologiyası/ məfkurəsi; **Marxist ~** maksist ideologiya/məfkurə; *Our ideologies differ greatly Bizim ideologiyalarımız çox fərqlənir;* **according to Marxist ~** marksist ideologiyasına / məfkurəsinə görə
**ideologically** [ˌaɪdɪəˈlɔdʒɪklɪ] *adv* ideologiya / məfkurə cəhətdən, məfkurəcə; **~ correct** ideoloji cəhətdən/baxımdan doğru; *Ideologically, they have many differences İdeoloji/Məfkurəvi cəhətdən onlar arasında çoxlu fərqlər var*
**idiocy** [ˈɪdɪəsɪ] *n* **1.** idiotizm; **2.** səfehlik, sarsaqlıq, ağılsızlıq, giclik; **3.** axmaq/ gic /sarsaq hərəkət; *This is the height of idiocy Bu axmaqlığın/gicliyin son həddidir; It's sheer idiocy to go fishing in such bad weather Belə pis havada balıq tutmağa getmək tamam axmaqlıqdır*
**idiom** [ˈɪdɪəm] *n dilç.* **1.** idiom *(bir dilə xas olan və mənası tərkib hissələrini təşkil edən sözlərin ayrı-ayrılıqda götürülən mənası ilə düz gəlməyən sabit söz birləşməsi)*; **the popular/religious/classical ~s** populyar/dini/klassik idiomlar; *The Azerbaijani and the English idioms have very different characters Azərbaycan və ingilis idiomları arasında müxtəlif xüsusiyyətlər var;* **2.** *dilç.* şivə, ləhcə; dil; **the French ~** fransız dili; **local ~** yerli şivə / ləhcə

**impassable** [ım'pa:səbl] *adj* keçilməz, keçilməsi mümkün olmayan; minikkeçməz, işlək olmayan *(yol)*; ~ **road** keçilməsi mümkün olmayan /keçilməz yol; **swamps ~ to men** insanlar üçün keçilməz bataqlıq; **an ~ gulf between them** onların arasında keçilməz uçurum

**impasse** [æm'pa:s] *n fr.* 1. dalan 2. çıxılmaz / çətin vəziyyət

**impassion** [ım'pæʃn] *v* həyacanlandırmaq, həyacana salmaq, təsirləndirmək, dərin həyacan yaratmaq / oyatmaq

**impassioned** [ım'pæʃnd] *adj* ehtiraslı, qızğın, coşğun, hərarətli, həvəsli, atəşli, odlu, alovlu, həyəcanlı; ~ **glance** ehtiraslı/ hərarətli / alovlu baxış; **an ~ speech** odlu / alovlu / coşğun / həyacanlı nitq

**impassive** [ım'pæsıv] *adj* 1. laqeyd, süst, ölgün, hissiz, ruhsuz, key; ~ **expression** laqeyd ifadə *(üzdə)*; 2. dinc, sakit

**impassively** [ım'pæsıvlı] *adj* laqeyd, laqeydcə, süst/laqeyd bir vəziyyətdə; sakitcə; *The accused sat impassively as the judge sentenced him to ten years in prison Hakim müttəhimə on il həbs cəzası verəndə o, süst bir vəziyyətdə oturmuşdu*

**impatience** [ım'peıʃns] *n* 1. səbirsizlik, hövsələsizlik; **to wait with ~ for** *smb.* bir kəsi səbirsizliklə gözləmək; 2. dözümsüzlük; dözülməzlik; yolverilməzlik; ~ **of contradiction** etiraza qarşı dözülməzlik

**impatient** [ım'peıʃnt] *adj* 1. səbirsiz, hövsələsiz; **an ~ child** səbirsiz uşaq; **to grow ~** səbirsizləşmək, hövsələsiz/səbirsiz olmaq; səbirdən/hövsələdən çıxmaq; **to be ~** hövsələsiz/səbirsiz olmaq; *Don't be so impatient! The bus will be here soon Belə hövsələsiz olma/olmayın! Avtobus indicə burada olacaq*; 2. tezhirslənən, tezacıqlanan, tündməcaz, əsəbi; acıqlı, hirsli; ~ **answer** əsəbi /acıqlı/hirsli cavab; **to be ~ of** *smb.'s* **absence** bir kəsin olmamağına əsəbiləşmək; ~ **temper** dözülməz xarakter/xasiyyət; ~ **of heat** istiyə dözməmə; 3. narahat, səbirsizliklə gözləyən; *He is impatient to begin O, başlamağı səbirsizliklə gözləyir*; **to be ~ for the ship's arrival** gəminin gəlməsini səbirsizliklə gözləmək; **to be ~ to see** *one's* **sweetheart** sevgilisini görməyi səbirsizliklə gözləmək

**impatiently** [ım'peıʃntlı] *adv* səbirsizliklə, səbirsiz bir halda/tərzdə, hövsələsizliklə, hövsələsiz bir tərzdə / halda

**impeach** [ım'pi:tʃ] *v* 1. şübhələnmək, şübhə altına almaq, şübhə etmək; **to ~ a fact** fakta şübhə etmək; **to ~** *smb.'s* **motives** bir kəsin bəhanəsinə şübhə etmək; **to ~ the deposition of a witness** şahidin şəhadətinə şübhə etmək; **to ~** *smb.'s* **credit /honour** bir kəsin şərəfini/şöhrətini şübhə altında qoymaq; 2. *hüq.* **(of, with)** ağır cinayətə görə ittiham etmək; **to ~** *smb.* **of /with a crime** bir kəsi ağır cinayət işlətməkdə ittiham etmək

**impeachable** [ım'pi:tʃəbl] *adj* 1. *hüq.* məhkəməyə cəlb oluna bilən, məhkəməlik; 2. şübhəli, şübhə edilə bilən/altına alına bilən; ~ **motives** şübhəli dəlillər/sübutlar / əsaslar

**impeachment** [ım'pi:tʃmənt] *n* 1.şübhə, etimadsızlıq; ~ **of the veracity of a witness** şahidin doğru danışdığına şübhə etmə; **without ~ to their honour** onların ləyaqətini alçaltmadan; 2. *hüq.* günahlandırma və məhkəməyə cəlb etmə; impiçment *(yüksək vəzifəli şəxsə etimad göstərməmə)*; **on ~ for treason** dövlətə xəyanətdə ittihama görə; ~ **of waste** əmlakı korlamağa görə məsuliyyət

**impearl** [ım'pə:l] *v* 1. *şair.* mirvariyə bənzətmək/oxşatmaq; **dew-drops which the sun ~s** günəşin mirvari kimi parlatdığı şeh damcıları; 2. mirvari ilə bəzəmək

**impeccability** [ım,pekə'bılıtı] *n* eyibsizlik, nöqsansızlıq, qüsursuzluq, təmizlik

**impeccable** [ım'pekəbl] *adj* qüsursuz, eyibsiz, nöqsansız, ləkəsiz, təmiz; ~ **behaviour** qüsursuz davranış; *His written English is impeccable Onun ingiliscə yazısı nöqsansızdır / qüsursuzdur*

**impeccably** [ım'pekəblı] *adv* yaxşı, qüsursuz, nöqsansız; **to dress ~** yaxşı/qüsursuz geyinmək

**impecunious** [,ımpı'kju:nıəs] *adj* pulsuz, kasıb, ehtiyacı olan; **an ~ student** pulsuz / kasıb tələbə

**impede** [ım'pi:d] *v* mane olmaq, əngəl / maneçilik / çətinlik törətmək; çətinlik / maneyə yaratmaq; yubatmaq, ləngitmək, gecikdirmək; **to ~ communication** 1) rabitəyə əngəl/maneçilik törətmək; 2) əlaqəni çətinləşdirmək; **to ~ negotiations** danışıqları çətinləşdirmək, danışıqlara əngəl törətmək; **to ~ traffic** küçə hərəkətinə mane olmaq

**impedient** [ım'pi:dıənt] *adj* mane / əngəl törədən, mane olan, maneçilik yaradan / törədən

**impediment** [ım'pedımənt] *n* 1. əngəl, manea, çətinlik, ilişik; ləngimə, yubanma, gecikmə; **an ~ to progress** inkişaf yolunda əngəl / manea; **to breed ~s** çətinliklər / əngəllər törətmək/yaratmaq; **to brush aside/to remove ~s** maneələri aradan qaldırmaq/dəf etmək; 2. kəkələmə, pəltəkləmə, pəltəklik, nitqin qüsuru; *He has an impediment in his speech O, danışanda kəkələyir*

**impedimenta** [ım,pedı'mentə] *n* baqaj, yük; *They brought their children, the cat, the dog, and the rest of their impedimenta Onlar uşaqlarını, pişiyi, iti və qalan yüklərini gətirdilər*

**impel** [ım'pel] *v* 1. vadar/məcbur/təhrik etmək; həvəs oyatmaq; **to ~** *smb.* **to do** *smth.* bir kəsi bir şeyi etməyə vadar/məcbur etmək; *Hunger impelled me to finish my work quickly Aclıq məni işimi tez qurtarmağa vadar etdi*; **to be ~led to take** *smb.'s* **side in a quarrel** mübahisədə bir kəsin tərəfini saxlamağa vadar/məcbur olmaq; 2. hərəkətə gətirmək; **a ship ~led by the wind** küləyin hərəkətə gətirdiyi gəmi



**impelling** [ım'pelıŋ] *adj* vadaredici, sövqedici; ~ **force** vadaredici/sövqedici qüvvə

**impend** [ım'pend] *v* 1. yaxınlaşmaq, çatmaq; yaxında olmaq; *His birthday was impending Onun ad günü yaxınlaşırdı*; 2. qorxutmaq, hədələmək, təhdid etmək, təhlükə yaratmaq, başının üstünü almaq *(təhlükə, fəlakət və s. haq.)*; **the evil that ~s** təhlükə yaradan fəlakət

**impendence** [ım'pendəns] *n* qaçılmazlıq, labüdlük, zərurilik; təhlükə

**impending** [ım'pendıŋ] *adj* 1. yaxınlaşan, yaxınlaşmaqda olan; ~ **storm** yaxınlaşan / yaxınlaşmaqda olan tufan; ~ **death** yaxınlaşmaqda olan ölüm; **warnings of ~ disaster** yaxınlaşmaqda olan fəlakət haqqında xəbərdarlıqlar; 2. hədələyən, hədələyici, təhdid edən *(təhlükəni, fəlakəti və s.)*; ~ **danger** hədələyici təhlükə; 3. asılan, asılmış, sallanan

**impenetrability** [ım,penıtrə'bılıtı] *n* keçirməmə *(suyu, işığı, səsi və s.)*, buraxmama qabiliyyəti *(suyu, işığı, səsi və s.)*

**impenetrable** [ım'penıtrəbl] *adj* 1. keçirməyən, buraxmayan *(suyu, işığı, səsi və s.)*; **cloth ~ to water/moisture** su/nəm keçirməyən parça; 2. keçilməz, keçilməsi mümkün olmayan; basılmaz; ~ **fortress** basılmaz qala; ~ **jungle / forest** keçilməz cəngəllik / meşə; 3. qaranlıq, zülmət; ~ **darkness** zülmət qaranlıq; 4. ölü, əsrarəngiz, yatmış; ~ **silence** ölü / əsrarəngiz sakitlik; ~ **conscience** yatmış vicdan; 5. sirli, anlaşılmaz, dərkedilməz, ağlaçatmaz, ağılasığmaz; **the ~ depths of the sea** dənizin sirli/anlaşılmaz dərinliyi; ~ **mystery** dərkedilməz/ağılasığmaz sirr; 6. təsirədüşməyən; **a mind ~ by/to new ideas** təsirədüşməyən zəka

**imperative**[1] [ım'perətıv] *n* 1. *qram.* imperativ *(felin əmr forması)*; 2. *fəls.* imperativ *(idealist fəlsəfədə: qəti tələb, qeyd-şərtsiz tələb)*

**imperative**[2] [ım'perətıv] *adj* 1. amiranə; ~ **command** əmranə sərəncam/hökm; ~ **gesture** əmranə əl-qol hərəkəti; **to say** *smth.* **in an ~ tone** bir şeyi əmranə tonla demək; 2. inadlı, təkidli, çox gərəkli/lazımlı/zəruri; ~ **request** təkidli tələb; *It's imperative to go at once Dərhal getmək zəruridir*; 3. *qram.* ~ **mood** əmr forması *(feldə)*

**imperceptible** [,ımpə'septəbl] *adj* görünməyən, seçilməyən, hiss edilməyən, nəzərə çarpmayan; çox az, cüzi; ~ **change** güclə sezilən/nəzərə çarpmayan/cüzi dəyişiklik; ~ **touch** yüngül toxunma; ~ **change in temperature** temperaturda cüzi dəyişiklik

**imperceptibly** [,ımpə'septəblı] *adv* azca, çox cüzi olaraq, güclə seziləcək dərəcədə; *The light faded almost imperceptibly İşıq cüzi olaraq zəiflədi*

**imperfect** [ım'pə:fıkt] *adj* 1. qeyri-mükəmməl, kəsirli, nöqsanlı, qüsurlu, naqis, pis; ~ **knowledge** qeyri-mükəmməl bilik; 2. yarımçıq, natamam, bitməmiş, tamamlanmamış; ~ **verse** yarımçıq/bitməmiş şer; 3. *qram.* **the ~ tense** imperfekt *(bitməmiş keçmiş zaman)*

**imperfection** [,ımpə'fekʃn] *n* 1. natamamlıq, yarımçıqlıq, mükəmməl olmama; 2. çatışmama, nöqsan, qüsur, eyib; **to expose/to reveal ~s** çatışmazlıqları/nöqsanları açıb göstərmək; *The only slight imperfection in the painting is a scratch in the corner Şəkildə yeganə qüsur küncdəki cızıqdır; I love her, for all her imperfection Onun bütün nöqsanlarına baxmayaraq, mən onu sevirəm; There's much imperfection in nature Təbiətdə çoxlu çatışmazlıqlar/nöqsanlar var*

**imperial** [ım'pıərıəl] *adj* 1. imperiya; **the ~ palace** imperiya sarayı; ~ **army** imperiya ordusu; ~ **flag** imperiya bayrağı; ~ **city** imperiya mərkəzi/paytaxtı *(xüs. Romada)*; 2. imperator; ~ **crown/throne** imperator tacı / taxtı; 3. suveren; müstəqil, ali, yüksək; 4. əzəmətli, möhtəşəm; təmtəraqlı, dəbdəbəli, cəlallı; ~ **banquets** dəbdəbəli/təmtəraqlı ziyafət; ~ **palaces** möhtəşəm / dəbdəbəli / cəlallı saraylar; 5. əla keyfiyyət və ya böyük ölçü; ~ **tea** əla növ /keyfiyyətli çay; ~ **drink** əla keyfiyyətli içki; 6. standart/müəyyən edilmiş *(ingilis ölçüləri haq.)*; ~ **weights and measures** ölçü və çəki vahidləri *(Böyük Britaniyada qəbul edilmiş)*; ~ **gallon** ingilis qallonu *(İngiltərədə mayelər üçün 4,5 litrə bərabər ölçü vahidi)*; ~ **pint** ingilis pintası *(İngiltərədə 0,56 litrə bərabər maye və səpələnən maddələr üçün ölçü vahidi)*

**imperialism** [ım'pıərıəlızm] *n* imperializm; **economic ~** iqtisadi imperializm; **struggle against ~** imperializmə qarşı mübarizə

**imperialist**[1] [ım'pıərıəlıst] *n* imperialist

**imperialist**[2] [ım'pıərıəlıst] *adj* imperialist; ~ **countries** imperialist ölkələr; ~ **wars** imperialist müharibələri; ~ **forces** imperialist qüvvələr

**imperialistic** [ım,pıərıə'lıstık] *adj* = **imperialist**[2]

**imperil** [ım'perəl] *v* təhlükəyə məruz qoymaq; risk etmək; **to ~** *one's* **life** həyatını təhlükəyə salmaq/məruz qoymaq; **to ~** *one's* **future** gələcəyilə risk etmək, gələcəyini təhlükəyə salmaq

**imperious** [ım'pıərıəs] *adj* 1. əmiranə; hökmü çatan, səlahiyyətli, səlahiyyəti olan; zalım, müstəbid, lovğa, təkəbbürlü, dikbaş, ötkəm; iddialı, başqalarını bəyənməyən; ~ **look** əmiranə /təkəbbürlü/iddialı baxış; ~ **temper** ötkəm /iddialı xarakter; ~ **gesture** əmiranə/təkəbbürlü əl-qol hərəkəti; ~ **tone** əmiranə/lovğa/təkəbbürlü ton; ~ **aristocrat** lovğa/təkəbbürlü aristokrat/əsilzadə; ~ **attitude** təkəbbürlü/iddialı münasibət; 2. qəti, təkidli; ən vacib/ mühüm; ~ **want** ən zəruri ehtiyac; **to send an ~ command** təkidli əmr göndərmək

**imperiously** [ım'pıərıəslı] *adv* lovğa/ötkəm /təkəbbürlü tərzdə; **to say** *smth.* ~ bir şeyi əmiranə/iddialı/lovğa/təkəbbürlü tərzdə demək

**imperishability** [ım.perıʃə'bılıtı] *n* ədəbilik, daimilik; çürüməmə, dağılmama, məhv olmama
**imperishable** [ım'perıʃəbl] *adj* **1.** solmayan, solmaz; ölməz, əbədi; unudulmaz; ~ **glory/fame** ölməz/əbədi şöhrət; ~ **impression** unudulmaz / əbədi təəssürat; **an ~ memory of** *smb.* bir kəs haqqında əbədi xatirə; ~ **words** unudulmaz sözlər; **2.** çürüməyən, xarab olmayan, uzun müddət saxlanıla bilən
**impermanence** [ım'pə:mənəns] *n* dəyişkənlik, səbatsızlıq, mütərəddidlik; qərarsızlıq; davamsızlıq, sürəksizlik, uzun sürməmə; müvəqqətilik
**impermanent** [ım'pə:mənənt] *adj* dəyişkən, tezdəyişən, davamsız, səbatsız, mütərəddid
**impermeable** [ım'pə:mıəbl] *adj* **1.** keçirməyən, buraxmayan *(suyu, işığı və s.)*; germetik; ~ **to water** suburaxmayan, sukeçirməyən; **2.** *tex.* sıx, möhkəm, kip *(bənd / qaynaq yeri, bitişik yer)*
**impermissible** [.ımpə'mısəbl] *adj* yolverilməz, yol verilə bilməyən, qadağan/yasaq edilmiş
**impersonal** [ım'pə:sənl] *adj* **1.** qərəzsiz, tərəfkirlik etməyən, ədalətli, bitərəf, üz görməyən; obyektiv; ~ **discussion** qərəzsiz/obyektiv müzakirə; ~ **statement** qərəzsiz/obyektiv bəyanat; **an ~ point of view** ədalətli/obyektiv/qərəzsiz baxış; *Let's keep the discussion impersonal so as not to embarass anyone Heç kəsi narazı etməmək üçün gəlin müzakirəni obyektiv aparaq;* **2.** simasız, şəxsiyyətsiz; *Slaves were regarded as impersonal men Qullar simasız/şəxsiyyətsiz adamlar hesab edilirdilər;* **3.** *qram.* şəxssiz; ~ **pronoun** şəxssiz əvəzlik; ~ **sentence** şəxssiz cümlə
**impersonally** [ım.pə:sə'nælı] *adv* obyektiv, qərəzsiz; obyektiv/qərəzsiz olaraq, üz görmədən, insafla, ədalətlə
**impersonality** [ım.pə:sə'nælıtı] *n* qərəzsizlik, obyektivlik, üzgörməzlik, bitərəflik; ədalətlilik, insaflılıq
**impersonate** [ım'pə:səneıt] *v* **1.** *teatr.* rol oynamaq/ ifa etmək; **to ~ Hamlet** Hamlet rolunu oynamaq; **2.** təcəssüm etdirmək, təmsil/ifadə etmək, göstərmək, canlandırmaq; **to ~ beauty/sorrow/grief** gözəlliyi/ dərdi/kədəri təcəssüm etdirmək; *He impersonates the spirit of the people O, xalqın mənəviyyatını təcəssüm etdirir;* **3.** yamsılamaq, təqlid etmək; *He can impersonate many well-known politicians O, çox tanınmış siyasətçiləri təqlid edə bilir;* **4.** göstərmək, qələmə vermək; *He was caught trying to impersonate a security guard O, özünü təhlükəsizliyin keşikçisi kimi qələmə verməyə çalışarkən yaxalandı*
**impersonation** [ım.pə:sə'neıʃn] *n* **1.** şəkil, təsvir; **2.** *teatr.* rol ifa etmə / oynama; **3.** təcəssüm etdirmə, təmsil etmə, göstərmə, canlandırma; şəxsləndirmə; **4.** özünü bir kəsin yerinə qoymağa çalışma; təqlid etmə, yamsılama
**impersonator** [ım'pə:səneıtə*] *n* təqlidçi, təqlid edən, yamsılayan *(adam)*
**impersonify** [.ımpə:'sənıfaı] *v* **1.** obrazını yaratmaq *(bir kəsin)*; yamsılamaq, təqlid etmək *(bir kəsi)*; **2.** təcəssüm etdirmək, göstərmək, canlandırmaq, təmsil / ifadə etmək
**impersuadable** [.ımpə'sweıdəbl] *adj* inanmayan, tovlanmayan, dilə tutula bilməyən, yola gəlməyən
**impertinence** [ım'pə:tınəns] *n* **1.** ədəbsizlik, qabalıq, kobudluq, hörmətsizlik; həyasızlıq, sırtıqlıq, abırsızlıq; həyasız/abırsız hərəkət; **2.** yersizlik, münasibətsizlik; **3.** mənasızlıq, cəfənglik, cəfəngiyyat; mənasızlıq *(söz və s. haq.)*
**impertinent** [ım'pə:tınənt] *adj* **1.** həyasız, utanmaz, sırtıq, ədəbsiz, qaba, kobud, sözqaytaran; ~ **answer** qaba/kobud/ədəbsiz cavab; **a very ~ child** çox ədəbsiz/həyasız uşaq; ~ **behaviour** həyasız/ ədəbsiz davranış; ~ **remark** qaba / kobud irad; ~ **young boy** həyasız / ədəbsiz gənc oğlan; **to be ~ to** *smb.* bir kəsə qarşı ədəbsiz / qaba/kobud olmaq; **2.** yersiz, münasibətsiz, işə dəxli olmayan; **3.** mənasız, cəfəng, boş; axmaq, gic, sarsaq, ağılsız, başıboş, yelbeyin
**impertinently** [ım'pə:tınəntlı] *adv* həyasız, qaba, kobud, tərbiyəsiz; həyasız-həyasız, qaba-qaba, kobud-kobud; **to speak** ~ həyasız-həyasız danışmaq
**imperturbability** [ımpə.tə:bə'bılıtı] *n* sakitlik, soyuqqanlılıq, özünü itirməmə, təmkin, təmkinlik
**imperturbable** [.ımpə'tə:bəbl] *adj* sakit, soyuqqanlı, təlaşa düşməyən, özünü itirməyən, təmkinli
**imperturbably** [.ımpə'tə:bəblı] *adv* sakitcə, sakit bir tərzdə, soyuqqanlılıqla, təlaş keçirmədən, təmkinlə
**impervious** [ım'pə:vıəs] *adj* **1.** keçirməyən, buraxmayan *(suyu, işığı, səsi və s.)*; keçilməz, keçilməsi mümkün olmayan; əlçatmaz, əldə edilməz; **fabric ~ to moisture** nəm buraxmayan / keçirməyən parça; ~ **to light** işıqburaxmayan, işıq keçirməyən; ~ **to water** suburaxmaz, sukeçirməz; **2.** kar, biganə, laqeyd *(yalvarışa və s.)*; **to be ~ to argument** dəlillərə laqeyd/biganə olmaq; ~ **to criticism** tənqidə biganəlik
**impetigo** [.ımpı'taıgou] *n* *(pl* **-os** [-ouz]) **1.** *tib.* impetiqo *(dəridə çat yarası əmələ gətirən yoluxucu xəstəlik)*; **2.** *bayt.* keçəllik, qoturluq; dəmrov
**impetuosity** [ım.petju'əsıtı] *n* **1.** itilik, cəldlik, tezlik, sürətlilik; coşğunluq, kəskinlik, sərtlik; qızğınlıq, çılğınlıq; hövsələsizlik, tündməcazlıq, hirslilik, tez özündən çıxma; *Impetuosity is his failing Hövsələsizlik/ Tündməcazlıq/ Çılğınlıq onun çatışmazlığıdır; Flames issued forward with great impetuosity Alov var gücü ilə bayıra çıxdı/vurdu;* **2.** həmlə, ani hücum; coşma, coşğunluq, sürətli/kəskin hərəkət
**impetuos** [ım'petjuəs] *adj* **1.** çox tələsik/iti /sürətli; çox cəld; şiddətli, coşğun, kəskin, qızğın, sürətli; ~ **gale** şiddətli külək; ~ **stream** coşğun sel; ~ **torrent** coşğun axın; **2.** impulsiv, qeyri-iradı; hərarətli, odlu, alovlu, odlu-alovlu, qızğın; hövsələsiz, tündxasiyyət, tündməcaz, tez özündən çıxan, çılğın, hirsli, acıqlı; **in a fit of ~ anger** hirsli / acıqlı vaxtda; ~ **remarks** impulsiv/qeyri-iradi mülahizə; **an ~ young woman** çılğın qızğın gənc qadın
**impetuosly** [ım'petjuəslı] *adv* tələsik, şiddətlə, qızğın / kəskin / şiddətli bir tərzdə; hərarətlə, odlu-alovlu
**impetus** ['ımpıtəs] *n* **1.** təkan, səbəb, stimul; **temporary ~** müvəqqəti təkan/stimul; **to give an ~ to** *smth.* bir şeyə təkan vermək; *Her speech gave an impetus to my ideas Onun nitqi mənim ideyalarıma təkan / stimul verdi; The treaty gave fresh impetus to trade Müqavilə ticarətə yeni təkan / stimul verdi*
**impiety** [ım'paıətı] *n* **1.** allaha inanmama, ateizm, dinsizlik; inamsızlıq, inanmama; **2.** hörmətsizlik, sayğısızlıq, ehtiramsızlıq, saymazlıq; ~ **to the dead** ölülərin xatirəsinə hörmətsizlik
**impinge** [ım'pındʒ] *v* **(on/upon,** *smth./ smb.)* **1.** toqquşmaq *(bir-birilə)*; toxunmaq, üstünə çıxmaq, rastlaşmaq, təsadüf etmək, qarşısına çıxmaq; dəymək; **2. (on, upon)** qəsd etmək, əl uzatmaq / atmaq, toxunmaq; sui-qəsd etmək; **to ~ upon** *smb.'s* **authority** bir kəsin nüfuzuna qəsd etmək; **to ~ upon** *smb.'s* **rights** bir kəsin hüquqlarına qəsd etmək/toxunmaq; **to ~ on the sovereignty of a country** ölkənin suverenliyinə qəsd etmək / suverenliyini pozmaq
**impingement** [ım'pındʒmənt] *n* **1.** toqquşma; **2.** zərbə
**impious** ['ımpıəs] *adj* **1.** *din.* günahkar, günahlı; **2.** hörmətsiz, sayğısız, hörmət etməyən / gözləməyən, ehtiramsız
**impish** ['ımpıʃ] *adj* nadinc, dəcəl, şeytan, şuluq, şuluqçu, qalmaqalçı; ~ **laughter** məkrli / istehzalı gülüş
**impishly** ['ımpıʃlı] *adv* nadinc, nadinc-nadinc, dəcəl-dəcəl
**impishness** ['ımpıʃnıs] *n* nadinclik, dəcəllik, şuluqluq, qalmaqalçılıq
**implacable** [ım'plækəbl] *adj* rəhmsiz, amansız, daşürəkli, insafsız, zalım, qəddar, mürvətsiz; barışmaz; ~ **enemy** barışmaz düşmən; ~ **hatred** qatı nifrət; ~ **vengeance** amansız qisas
**implacably** [ım'plækəblı] *adv* rəhmsizcəsinə, amansızcasına, insafsızcasına, qəddarcasına, barışmaz bir tərzdə
**implant¹** [ım'pla:nt] *n* *tib.* radiumlu kapilyar borucuq *(xərçəng xəstəliyinin müalicəsində istifadə olunur)*
**implant²** [ım'pla:nt] *v* *(əsas. məchul növdə işlənir)* **1.** yerləşdirmək, köçürmək, təlqin/təsir etmək, beyninə yeritmək *(fikri, ideyanı, baxışı və s.)*; **to ~ one's convictions / views in** *smb.'s* **mind** öz inamını / baxışını bir kəsin beyninə yeritmək; **to ~ religious beliefs in children** uşaqlara dini əqidələri təlqin etmək; **to ~ doubt in** *smb.'s* **mind** bir kəsdə inamsızlıq yaratmaq; **2.** əkmək, basdırmaq *(ağac, bitki və s.)*; **3.** *tib.* əzələyə radiumlu kapilyar borucuq yeritmək *(xərçəng xəstəliyinin müalicəsində)*
**implantation** [.ımpla:n'teıʃn] *n* **1.** yeritmə, yeridilmə, təlqin etmə *(fikri, ideyanı və s.)*; **2.** əkmə *(bitkini, ağacı və s.)*; **3.** *tib.* implantasiya, köçürmə *(hüceyrələrin, toxumaların və ya bütöv orqanın yeni yerə köçürülməsi)*
**implausible** [ım'plɔ:zəbl] *adj* inanılmaz, ağıla gəlməyən/sığmayan, mümkün olmayan; yalan, doğruya oxşamayan, həqiqətə uyğun olmayan; **an ~ story** inanılmaz / doğruya oxşamayan əhvalat; **an ~ theory** ağılasığmayan nəzəriyyə
**implausibly** [ım'plɔ:zəblı] *adv* yalan, inanılmaz bir tərzdə, qeyri-adi bir surətdə
**implement¹** ['ımplımənt] *n* **1.** alət, vasitə; **agricultural/farming ~s** kənd təsərrüfatı alətləri; **bronze/stone ~s** bürünc/daş alətlər; **~s of production** *siya. iq.* istehsal vasitələri; *Man's earliest implements were carved from stone and bone İnsanın ilk alətləri daşdan və sümükdən düzəldilmişdi;* **2.** *adət. pl* ləvazimat; avadanlıq; **fishing ~s** balıq ovu ləvazimatları; **kitchen ~s** mətbəx avadanlıqları / ləvazimatları
**implement²** ['ımplıment] *v* **1.** yerinə yetirmək, icra/ ifa etmək, həyata keçirmək; **to ~ an obligation** öhdəliyi yerinə yetirmək; **to ~ a project** planı həyata keçirmək; **to ~ a policy** siyasəti həyata keçirmək; **2.** alətlə təmin etmək; **3.** doldurmaq, ödəmək, yerini doldurmaq; **to ~ wages by pauper relief** əmək haqqına dilənçi payı əlavə etmək
**implicate¹** ['ımplıkıt] *adj* dolaşıq, qarışıq; pırtlaşıq
**implicate²** ['ımplıkeıt] *v* **1.** cəlb etmək, çəkmək, qarışdırmaq, qatmaq; **to be ~d in a crime** cinayətə qatışdırılmaq, cinayətdə əli olmaq/iştirak etmək; **to be ~d in a plot** sui-qəsddə əli olmaq /iştirak etmək; *The police are satisfied that he was not implicated in the robbery Polislər məmnun oldular ki, onun quldurluqda əli yoxdur;* **2.** var olmaq, eyham vurmaq; *These words implicate a contradiction Bu sözlərdə bir ziddiyyət vardır*
**implication** [.ımplı'keıʃn] *n* **1.** cəlb etmə / edilmə, daxil etmə; qarışdırma, qatma, calama *(bir işə)*; **2.** əlaqəsi olma, iştirak etmə, əli olma, iştirak; əlbir olma *(pis işdə, cinayətdə)*; **3.** gizli məna / məqsəd; **historical ~** tarixi məna/məqsəd; **social ~** ictimai məna; **far-reaching ~** tamamilə aydın eyham; *He misunderstood the implication of the statement O, bəyanatın mənasını səhv başa düşdü;* **by ~** mənaca; **either expressly or by ~** bilvasitə, yaxud bilavasitə
**implicit** [ım'plısıt] *adj* **1.** fikirdə/nəzərdə tutulan, birbaşa deyilməyən; gizli; ~ **threat** gizli hədə; ~ **consent** dinməz razılıq; ~ **distinction** aydın

görünməyən fərq; 2. şərtsiz, danışıqsız, tam, kor-koranə; ~ **belief/confidence/faith** korkoranə inam; ~ **obedience** korkoranə / tam itaət etmə

**implicitly** [ım'plısıtlı] *adv* 1. bilvasitə, dolayısı ilə; 2. sözsüz, danışıqsız, qeyd-şərtsiz olaraq, tamamilə; *She trusts me implicitly O mənə danışıqsız/qeyd-şərtsiz olaraq etibar edir*

**implicitness** [ım'plısıtnıs] *n* 1. aydın / aşkar olmama; qeyri-müəyyənlik, anlaşılmazlıq; 2. qətilik, qeydsizlik, şərtsizlik

**implied** [ım'plaıd] *adj* nəzərdə / fikirdə tutulan, gözlənilən, təxmin/güman edilən; ~ **contract** nəzərdə tutulan müqavilə; ~ **warrantry** nəzərdə tutulan qarantiya; ~ **yield** gözlənilən/güman edilən məhsul

**implode** [ım'ploud] *v* 1. partlamaq *(içəridən)*, dağılmaq *(içəridən)*; *The windows on both sides of the room had imploded Otağın hər iki tərəfindən pəncərələr içəri uçmuşdu*; 2. *fon.* partlayışı neytrallaşdırmaq, başqa bir partlayıcı samiti digər bir partlayıcı samitdən və ya burun səsindən əvvəl partlayışsız tələffüz etmək

**imploration** [,ımplɔ'reıʃn] *n* yalvarma, yalvarıb-yaxarma

**implore** [ım'plɔ:ʳ] *v* yalvarmaq, yalvarıb-yaxarmaq, yalvarıb-yapışmaq; **to ~ *smb.* for aid / assistance/help** bir kəsə kömək üçün yalvarıb-yaxarmaq; **to ~ *smb.*'s forgiveness / pardon** bir kəsə əfv üçün yalvarmaq/yalvarıb-yaxarmaq; *They implored the girl to stay Onlar qıza yalvardılar ki, qalsın*

**imploring** [ım'plɔ:rıŋ] *adj* yalvaran, yalvarıcı, yalvarış ifadə edən; **an ~ glance / look** yalvarıcı baxış; *She gave me an imploring look O, mənə yalvarıcı tərzdə baxdı*

**imploringly** [ım'plɔ:rıŋlı] *adv* yalvarıcı bir tərzdə, yalvarış ifadə edən baxışla

**imply** [ım'plaı] *v (pt, pp* **implied**) fikrində tutmaq, güman / fərz etmək, düşünmək, anlamaq, ifadə etmək; *Silence often implies consent Susmaq razılıq əlamətidir; His silence seemed to imply agreement Onun susması razılıq əlaməti idi; What do his words imply? Onun sözlərinin mənası nədir?*

**impolite** [,ımpə'laıt] *adj* ədəbsiz, nəzakətsiz, tərbiyəsiz, qaba, kobud, hörmətsiz; ~ **person** ədəbsiz/tərbiyəsiz adam; ~ **remark** yersiz irad; ~ **manners** qaba/kobud ədə; **to be ~ to *smb.*** bir kəsə qarşı nəzakətsiz olmaq

**impolitic** [ım'pɔlıtık] *adj* ağılsız, düşüncəsiz; yersiz, münasibətsiz; *It might be impolitic to refuse his offer Onun təklifini rədd etmək ağılsızlıq / yersiz ola bilərdi*

**imponderable** [ım'pɔndərəbl] *adj* çəkisiz, çəkisi olmayan, çəkiyə gəlməyən; çox asan; çox zəif, tutarsız; ~ **factors** çox zəif / tutarsız amillər /faktorlar; **an ~ problem / question** çox asan problem / məsələ

**import**[1] ['ımpɔ:t] *n* I 1. import, idxal, idxalat *(xaricdən mal gətirilməsi)*; **articles of ~** idxal şeyləri; 2. *adət. pl* import/idxal malları; **~s and exports** idxal və ixrac malları

**import** ['ımpɔ:t] *n* II 1. məna, mahiyyət; *What is the import of his remark? Onun iradının mənası/mahiyyəti nədən ibarətdir?*; 2. əhəmiyyət; **a matter of great ~** böyük əhəmiyyəti olan məsələ

**import**[2] ['ımpɔ:t] *adj* idxal; ~ **articles** idxal şeyləri; ~ **duty** idxal rüsumu/gömrük vergisi

**import**[3] [ım'pɔ:t] *v* I 1. idxal etmək; *The country has to import most of its raw materials Ölkə əksər xam malları idxal etməli olur;* **to ~ raw materials** xam malları idxal etmək

**import** [ım'pɔ:t] *v* II 1. ifadə /izhar etmək, demək; göstərmək, bildirmək; *What does this news import? Bu xəbər nə göstərir/nə deməkdir?*; 2. mənası olmaq; *In this case that does not import İndiki halda onun heç bir mənası yoxdur*

**importable** [ım'pɔ:təbl] *adj* idxal edilə bilən, idxal olunacaq

**importance** [ım'pɔ:tns] *n* 1. əhəmiyyət, mühümlük; məna; vaciblik; **commercial/ historical/strategic ~** ticarət/tarixi/strateji əhəmiyyət; **of vital ~** həyati əhəmiyyətli, çox vacib; **a fact/a matter of great ~** böyük əhəmiyyəti olan iş / məsələ; **a fact of no ~** əhəmiyyəti olmayan fakt; **a person of ~** nüfuzlu/ mötəbər şəxs; **the ~ to the country of a healthy economy** sağlam iqtisadiyyatın ölkə üçün əhəmiyyəti/vacibliyi; **to attach ~ to *smth.*** bir şeyə əhəmiyyət vermək; 2. iddia satma, təkəbbürlənmə, təşəxxüs satma, özünü çəkmə/dartma, lovğalanma; **to assume ~** lovğalanmaq, özünü dartmaq, iddia satmaq; **to puff out with ~** lovğalıqdan şişmək/burnunu dik tutmaq; **to swell with ~** iddia satmaq, təkəbbürlənmək, lovğalıqdan şişmək, qudurmaq

**important** [ım'pɔ:tnt] *adj* 1. vacib, əhəmiyyətli, mühüm; ciddi; ~ **decision** vacib / əhəmiyyətli /ciddi qərar; ~ **news** vacib / əhəmiyyətli/ciddi xəbər; ~ **meeting** vacib yığıncaq; 2. lovğa, iddialı, nüfuzlu, sözükeçən, mötəbər; ~ **people** nüfuzlu/iddialı / mötəbər adamlar; **to look ~** iddialı / mötəbər /lovğa görünmək

**importantly** [ım'pɔ:təntlı] *adv* təmkinlə, vüqarla; lovğa-lovğa, iddialı-iddialı; əhəmiyyətli dərəcədə

**importation** [,ımpɔ:'teıʃn] *n tic.* 1. import, idxal, idxalat, idxal etmə; 2. idxal edilən mal

**importer** [ım'pɔ:təʳ] *n tic.*1. idxalçı, idxal edən adam

**importunate** [ım'pɔ:tʃənət] *adj* 1. zəhlətökən, təngəgətirən, bezikdirən, usandıran, qarayaxa; ~ **creditor** zəhlətökən/usandırıcı/bezikdirən borc verən/kreditor; **an ~ beggar** zəhlətökən dilənçi; 2. inadlı, təkidli; çox gərəkli / lazımlı / zəruri; ~ **demands / claims** təkidli tələblər

**importunately** [ım'pɔ:tʃənətlı] *adv* 1. təkidlə, əl



çəkməyərək, təngə/cana gətirərək, həyasızcasına; 2. təkidlə, inadla, israrla

**importune**[1] [,ımpɔ:'tju:n] *adj* inadlı, təkidli, israrlı, səbatlı; əlçəkməyən, təngə/cana gətirən, zəhlətökən, usandıran; zıqqı, qarayaxa; bıqdırıcı

**importune**[2] [,ımpɔ:'tju:n] *v* 1. təngə / cana gətirmək, usandırmaq, bezdirmək, bıqdırmaq, bezar etmək, zəhlə tökmək; **to ~ *one's* friends /neighbours** dostlarını/qonşularını təngə/cana gətirmək, dostlarının /qonşularının zəhləsini tökmək; **to ~ *smb.* by *one's* visits** başçəkməklə bir kəsin zəhləsini tökmək/bir kəsi cana gətirmək; **to ~ *smb.* by *one's* complaints** şikayətləri ilə bir kəsi bezdirmək/usandırmaq; 2. təkrar-təkrar / təkidlə istəmək

**importunity** [,ımpɔ:'tju:nıtı] *n* zəhlə aparma, cana / təngə gətirmə, bezikdirmə, təkrar-təkrar istəmə

**impose** [ım'pouz] *v* 1. **(on, upon)** qoymaq, təyin etmək *(vergi, cərimə və s.)*; **to ~ a tax on *smb.*** bir kəsə vergi qoymaq; **to ~ a penalty on *smb.*** bir kəsə cərimə təyin etmək; 2. tapşırmaq, həvalə etmək; **to ~ a task on *smb.*** bir kəsə vəzifə tapşırmaq /həvalə etmək; 3. **(on, upon)** zorla boynuna qoymaq/qəbul etdirmək, vadar etmək; **to ~ *one's* views on *smb.*** öz fikirlərini/baxışlarını zorla bir kəsə qəbul etdirmək; **to ~ oneself where not invited** çağrılmamış yerə özünü zorla soxmaq; 4. **(on, upon)** aldatmaq, tovlamaq, kələk / hiylə/fırıldaq gəlmək; **to ~ a lie/a fib upon *smb.*** bir kəsi aldatmaq/tovlamaq; **to ~ upon a simpleton** sadəlövhə hiylə / kələk / fırıldaq gəlmək; **to be easily ~d** asan / tez aldanmaq; 5. **(on, upon)** güclü təsir etmək/oyatmaq; **to ~ upon *one's* hearers** dinləyicilərinə güclü təsir etmək, dinləyicilərində güclü təsir oyatmaq

**imposing** [ım'pouzıŋ] *adj* ciddi təsir yadan, vüqarlı, nüfuzlu, əzəmətli; ~ **appearance** vüqarlı/ əzəmətli görkəm; **an ~ old lady** vüqarlı/görkəmli qoca qadın; ~ **appearance /monument** əzəmətli tikili/abidə

**imposition** [,ımpə'zıʃn] *n* 1. qoyma *(müx. mənalarda)*, tapşırma, həvalə etmə *(tapşırıq)*; **to burden *smb.* with ~s** bir kəsi tapşırıqlarla yükləmək; 2. zorla boynuna qoyma/qəbul etdirmə; 3. vergi, vergi qoyma/qoyulma; **to lay on new ~s** yeni vergi qoymaq; **to pay ~s** vergiləri ödəmək/vermək; 4. yalan, fırıldaq, hiyləgərlik, dələduzluq, adam aldatma; **to escape ~** yalandan/fırıldaqdan qaçınmaq/özünü gözləmək; **to suspect *smb.* of ~** fırıldaqda / hiyləgərlikdə bir kəsdən şübhələnmək

**impossibility** [ım,pɔsə'bılıtı] *n* 1. imkansızlıq, mümkün olmama; 2. mümkün olmayan şey, qeyri-mümkünlük; *Don't expect me to do impossibilities Mümkün olmayan işi görəcəyimi məndən gözləmə/gözləməyin;* **the ~ of anyone winning a nuclear war** kiminsə nüvə müharibəsində qalib gəlməsinin qeyri-mümkünlüyü

**impossible** [ım'pɔsəbl] *adj* 1. qeyri-mümkün, mümkün olmayan, imkan xaricində olan, həyatakeçməz, həyata keçirilməsi mümkün olmayan, həyata keçirilə bilməyən; ~ **ambitions** həyata keçirilə bilməyən/həyatakeçməz arzular; ~ **task** yerinə yetirilə bilməyən tapşırıq; *It's impossible for me to go there today Mənim bu gün ora getməyim qeyri-mümkündür / mümkün deyil*; 2. qeyri-adi, həqiqətə bənzəməyən/oxşamayan; ~ **event/circumstance** qeyri-adi hadisə / vəziyyət; ~ **story** həqiqətə bənzəməyən / oxşamayan əhvalat; 3. *d.d.* dözülməz, qatlaşılmaz; yaramaz, iyrənc; ~ **person** dözülməz adam; *His bad temper makes life impossible for all the family Onun yersiz çılğınlığı bütün ailənin həyatını dözülməz edir; You're the most impossible person I've ever met Sən/siz mənim heç vaxt rast gəlmədiyim dözülməz/yaramaz adamsan / adamsınız;* **the ~** çətin iş, mümkün olmayan şey/iş, həyata keçirilməsi mümkün olmayan iş / şey; **to ask for ~** mümkün olmayan şey xahiş etmək; **to want ~** mümkün olmayan şey istəmək

**impossibly** [ım'pɔsəblı] *adv* qeyri-adi dərəcədə, çox; ~ **difficult** qeyri-adi dərəcədə / çox çətin

**impostor** [ım'pɔstəʳ] *n* yalançı, fırıldaqçı, adamaldadan, kələkbaz, dələduz; başqasının adını mənimsəyən, şarlatan

**imposture** [ım'pɔstʃəʳ] *n* yalan, hiylə, kələk, fırıldaq, fırıldaqçılıq, dələduzluq; biclik, fəndgirlik

**impotence** ['ımpətəns] *n* 1. zəiflik, gücsüzlük, taqətsizlik; acizlik, bacarıqsızlıq; **moral ~** mənəvi zəiflik/gücsüzlük/acizlik; ~ **of mind** ağlın zəifliyi, ağıl zəifliyi, kəmağıllıq; 2. *tib.* impotensiya *(kişilikdən düşmə, kişiliyi itirmə)*; **male ~** kişi impotensiyası

**impotent**[1] ['ımpətənt] *n* 1. iradəsiz, zəif xasiyyətli *(adam)*; 2. *tib.* impotent *(kişilikdən düşmüş /kişiliyini itirmiş adam)*

**impotent**[2] ['ımpətənt] *adj* 1. zəif, gücsüz, taqətsiz; aciz, bacarıqsız; *He wanted to do something for the people in the accident, but he was quite impotent to help O, qəzada zərərçəkmiş adamlar üçün bir şey etmək istəyirdi, lakin kömək etməkdə tamamilə aciz idi*; 2. *tib.* impotent, kişilikdən düşmüş, kişiliyini itirmiş

**impotently** ['ımpətəntlı] *adj* zəif, gücsüz, taqətsiz, zəif-zəif, gücsüz-gücsüz, taqətsiz bir halda / tərzdə

**impound** [ım'paund] *v* 1. heyvanı salmaq *(xalxala)*; **to ~ stray animals** sürüdən/naxırdan ayrılmış heyvanı xalxala salmaq; 2. salmaq *(həbsə)*; *The police impounded his car as evidence Sübut olaraq polis onun maşınını həbs etdi*

**impoverish** [ım'pɔvərıʃ] *v* 1. var-yoxdan çıxarmaq, iflasa səbəb olmaq, dilənçi vəziyyətinə

salmaq; 2. məzmunsuzlaşdırmaq, zəifləşdirmək *(üslubu, məzmunu)*; ifadəliliyini itirmək; 3. gücdən salmaq *(torpağı və s.)*; *Intensive cultivation has impoverished the soil İntensiv becərmə torpağı gücdən salıb*; 4. zəiflətmək, pisləşdirmək *(sağlamlığı)*; 5. bu və ya digər əlaməti, yaxud keyfiyyəti itirmək; **to ~ the blood** qanın tərkibini pisləşdirmək

**impoverished** [ɪm'pɒvərɪʃt] *adj* 1. kasıb, yoxsul, zəif, fağır, miskin; ~ **existence** kasıb/yoxsul yaşama; ~ **mind** zəif ağıl; 2. müəyyən keyfiyyətdən / xüsusiyyətdən məhrum

**impoverishment** [ɪm'pɒvərɪʃmənt] *n* 1. yoxsullaşma, kasıblaşma, dilənçiləşmə; dilənçi halına düşmə; 2. arıqlama, üzülmə, əldən düşmə; gücdən/qüvvədən düşmə *(torpaq haq.)*

**impracticability** [ɪm.præktɪkə'bɪlɪtɪ] *n* yerinə yetirilə bilməmə, icrası mümkün olmama, həyata keçirilməzlik

**impracticable** [ɪm'præktɪkəbl] *adj* 1. icrası mümkün olmayan, yerinə yetirilə bilməyən, həyatakeçirilməz; ~ **plan** yerinə yetirilməsi mümkün olmayan plan; *The building plans are impracticable Tikinti planları həyatakeçirilməzdir*; ~ **proposal / suggestion** praktik olmayan təklif; 2. inadlı, höcət, yolagetməz; ~ **person** inadlı/höcət adam; 3. keçilməz, keçilməsi mümkün olmayan; işlək olmayan, minik keçməz *(yol)*; ~ **defile** keçilməz dərə; ~ **road** işlək olmayan/minik keçməz yol

**impractical** [ɪm.præktɪkəl] *adj amer.* 1. qeyri-praktik, münasib/əlverişli olmayan, işə yaramayan, sərfəsiz, səmərəsiz; bacarıqsız; **an ~ person** bacarıqsız adam; 2. yerinə yetirilməsi mümkün olmayan; ~ **plan that is impossible to fulfil** yerinə yetirilməsi mümkün olmayan plan

**imprecate** ['ɪmprɪkeɪt] *v* lənət oxumaq / yağdırmaq, lənətləmək, qarğımaq

**imprecation** [.ɪmprɪ'keɪʃn] *n* lənət, lənətləmə, lənət yağdırma, qarğış, qarğıma; **to call down ~s upon *smb.*** bir kəsə qarğımaq, bir kəsə lənət / nifrin yağdırmaq; **to mutter ~s** burnunun altından qarğış etmək

**imprecise** [.ɪmprɪ'saɪs] *adj* dürüst / dəqiq / düz olmayan, səhv, yanlış

**imprecisely** [.ɪmprɪ'saɪslɪ] *adv* dürüst/düzgün olmayaraq, yanlış, səhv

**impregnable** [ɪm'pregnəbl] *adj* 1. əlçatmaz; alınmaz, basılmaz, ələkeçirilməz; ~ **camp** alınmaz düşərgə; ~ **fortress** alınmaz/basılmaz qala; 2. sarsılmaz, inkaredilməz, möhkəm; ~ **argument** inkaredilməz dəlil /sübut; ~ **belief** sarsılmaz / möhkəm inam

**impregnate**[1] [ɪm'pregnɪt] *adj* 1. münbitləşdirilmiş, məhsuldar edilmiş; 2. hamilə, ikicanlı, boylu; 3. **(with)** hopdurulmuş; doymuş; isladılmış

**impregnate**[2] ['ɪmpregneɪt] *v* 1. münbitləşdirmək, məhsuldar etmək; 2. ikicanlı/hamilə etmək; 3. məhsuldar etmək; 4. **(with)** doydurmaq, canına çəkdirmək, hopdurmaq; islatmaq; **to ~ wood with *smth.*** bir şeyi ağaca hopdurmaq; *The air was impregnated with fragrance Hava xoş ətir/rayihə ilə dolmuşdu; The smoke had impregnated their clothes Tüstü onların paltarına hopmuşdu*

**impresario** [.ɪmprə'sa:rɪəu] *n (pl* **-os** [-ouz] -ri) impressario *(konsert, tamaşa və s. təşkil edən adam)*

**impress**[1] ['ɪmpres] *n* 1. iz, nişanə, şəkil, əlamət; **an ~ of a foot** ayaq izi / şəkli; **to leave a lasting ~ on *smb.'s* character** bir kəsin xarakterində dərin iz buraxmaq; 2. ştempel, möhür; damğa

**impress**[2] [ɪm'pres] *v* 1. təəssürat yaratmaq, heyrətləndirmək, heyrətə salmaq, heyran/valeh etmək, mat qoymaq; **to ~ *smb.*** bir kəsdə təəssürat yaratmaq, bir kəsə təsir etmək; **to ~ *smb.* favourably /unfavourably** bir kəsdə yaxşı/pis təəssürat yaratmaq; **to be deeply/profoundly ~ed** güclü / dərin təəssürat altında olmaq; *He didn't impress me at all O, məndə heç bir təəssürat yaratmadı*; **to be ~ed by a book/ letter/speech/sight** kitabın/məktubun/nitqin /mənzərənin təsiri altında olmaq; *He was deeply impressed with what he had heard Eşitdiyi onu heyrətə saldı; I was very impressed by/at/ with his speech Mən onun nitqinə valeh oldum, Onun nitqi məni valeh / heyran etdi*; 2. **(on, upon)** təlqin/təsir etmək, inandırmaq, beyninə yeritmək; **to ~ *one's* belief on /upon others** öz inamını başqarına təlqin etmək /başqasının beyninə yeritmək; 3. nişan qoymaq, ştempelləmək, ştempel/möhür vurmaq; damğalamaq, damğa basmaq/ vurmaq; **to ~ wax with a seal** surquca möhür vurmaq; **to ~ a mark upon a surface, to ~ a surface with a mark** səthdə iz buraxmaq; 4. naxış basmaq *(metala)*, ştamplamaq *(ştamp vasitəsilə hazırlamaq/istehsal etmək)*; **to ~ a design on metal** rəsmi metal üzərinə basmaq

**impression** [ɪm'preʃn] *n* 1. təsir, təəssürat; **strong/poor ~** qüvvətli/zəif təəssürat; **to leave/to produce an ~ on *smb.*** bir kəsə təsir etmək, bir kəsdə təəssürat yaratmaq; **to evoke an ~** təsir/təəssürat oyatmaq; **to deepen/to sharpen/to strengthen the ~** təsiri/təəssüratı gücləndirmək; **to soften/ to weaken the ~** təsiri/təəssüratı yumşaltmaq/ zəiflətmək; **to be under the ~ of *smth.*** bir şeyin təsiri/təəssüratı altında olmaq; 2. iz, nişanə, yer; **the ~ of a hand/ a foot** əl/ayaq izi; **the ~ of fingers** barmaqların izi/yeri; **to make an ~ on metal** metal üzərində iz/nişanə açmaq; 3. *poliqr.* çap, çap etmə; basma, yenidən çap etmə *(kitabı dəyişmədən); Of this translation there were six impressions Bu tərcümədə kitab altı dəfə çap edilmişdi*

**impressionable** [ɪm'preʃnəbl] *adj* həssas, çox tez



təsirlənən/mütəəssir olan; nazikürəkli, ürəyi nazik / yuxa

**impressionism** [ɪm'preʃnɪzm] *n fəls.* impressionizm *(incəsəntdə və ədəbiyyatda realizmi rədd edən, ictimai məsələlərdən qaçan və məzmunun zərərinə olaraq formaya həddindən artıq fikir verən idealist cərəyan)*

**impressionist** [ɪm'preʃnɪst] *n* impressionist *(impressionizm tərəfdarı)*

**impressive** [ɪm'presɪv] *adj* dərin təsir bağışlayan / oyadan; təsirli; mənalı, ifadəli; həyəcan doğuran, həyəcanlandıran; valehedici, məftunedici; əzəmətli; ~ **book** dərin təsir bağışlayan kitab; ~ **building** əzəmətli bina/tikili; ~ **works of art** valehedici/məftunedici incəsənət əsərləri; ~ **event** həyəcan doğuran hadisə; ~ **ceremony** əzəmətli / təsirli mərasim; ~ **speech** mənalı/ifadəli nitq; *His collection of paintings is most impressive Onun şəkillər kolleksiyası çox təsirlidir*

**impressively** [ɪm'presɪvlɪ] *adj* ifadəli, təsirli, təsir oyadacaq bir tərzdə; **to speak ~** təsirli / ifadəli danışmaq

**imprest** ['ɪmprest] *n* avans, beh

**imprimatur** [.ɪmprɪ'ma:tə'] *n* 1. senzuranın icazəsi *(çap olunmaq üçün)*; **to give a book *one's* ~** kitabın nəşrinə icazə vermək; 2. sanksiya, icazə, bəyənmə

**imprint**[1] ['ɪmprɪnt] *n* 1. iz; yer; **the ~ of a foot / of a heel** ayağın / dabanın izi / yeri; 2. *məc.* nişanə, əlamət; **the ~ of anxiety** narahatlığın nişanəsi / əlaməti; *Suffering left an imprint on her face İztirab onun sifətində iz buraxıb*

**imprint**[2] [ɪm'prɪnt] *v* 1. möhür vurmaq, möhürləmək; ştempelləmək, ştempel vurmaq; **to ~ a postmark on a letter, to ~ a letter with a postmark** məktubun üstünə poçt ştempeli vurmaq; 2. iz/nəqş salmaq; **to ~ a design on wax** mumun üstündə iz/nəqşə salmaq; 3. iz buraxmaq /qoymaq; **to ~ the snow with footsteps** qar üzərində ayaq izləri qoymaq; **to ~ a kiss on *smb.'s* cheek** bir kəsin yanağında öpüş izi/yeri qoymaq; 4. dərin iz buraxmaq; qeyd etmək; təsbit etmək, möhkəmlətmək *(yaddaşda)*; **to ~ words** sözləri yaddaşda möhkəmlətmək; **ideas ~ed on the mind/memory** ağılda/yaddaşda möhkəmlənmiş fikirlər; *Imprint this in your memory Bunu yadında/yadınızda möhkəm saxla / saxlayın*

**imprison** [ɪm'prɪzn] *v* 1. dustaqxanaya / həbsxanaya / qazamata salmaq; *The men were imprisoned and tortured Kişiləri həbsxanaya saldılar və əzab verdilər;* 2. azadlıqdan məhrum etmək; salmaq; **to ~ a bird in a cage** quşu qəfəsə salmaq

**imprisoned** [ɪm'prɪznd] *adj* 1. həbsə / dustaqxanaya/qazamata salınmış; **an ~ person** həbsə/dustaqxanaya salınmış adam; 2. qəfəsə salınmış; **an ~ bird** qəfəsə salınmış quş

**imprisonment** [ɪm'prɪznmənt] *n* həbs; həbsə / dustaqxanaya / qazamata salma, dustaq etmə; ~ **for the term of *one's* natural life** *hüq.* ömürlük həbs/həbs etmə

**improbability** [ɪm.prɒbə'bɪlɪtɪ] *n* mümkün olmama, ehtimaldan uzaqlıq, ağılasığmazlıq, güman edilə bilməyən şey, doğruya oxşamayan; **the ~ of his being recaptured** onun yenidən tutulmasının mümkün olmaması

**improbable** [ɪm'prɒbəbl] *adj* doğruya oxşamayan, yalan, həqiqətə uyğun olmayan, inanılmaz; ağıla sığmayan/gəlməyən, mümkün olmayan; ~ **story** doğruya oxşamayan/ağıla sığmayan/inanılmaz əhvalat; **the most ~ things** mümkün olmayan/həqiqətə uyğun olmayan şeylər; *It's improbable that the level of unemployment will fall İşsizliyin səviyyəsinin aşağı düşəcəyi ağlasığmaz/inanılmaz məsələdir*

**improbably** [ɪm'prɒbəblɪ] *adv* inanılmaz / ağılasığmaz/mümkün olmayan bir tərzdə

**improgressive** [.ɪmprə'gresɪv] *adj* qeyri-proqressiv, proqressiv olmayan

**impromptu**[1] [ɪm'prɒmptju:] *n* ekspromt *(hazırlaşmadan söylənilən nitq, şer, çalınan musiqi)*, improvizasiya *(hazırlaşmadan yaradılmış musiqi, söylənilmiş şer)*

**impromptu**[2] [ɪm'prɒmptju:] *adj* improvizasiya olunmuş, hazırlıqsız düzəldilmiş; əvvəlcədən hazırlaşmadan; ~ **speech/ poems** əvvəlcədən hazırlaşmadan söylənilən nitq/deyilən şer; ~ **visit** gözlənilməz vizit

**impromptu**[3] [ɪm'prɒmptju:] *adv* hazırlıqsız, hazırlaşmadan; **to speak ~** hazırlıqsız / hazırlaşmadan danışmaq; *This was done almost impromptu Bu, demək olar ki, hazırlıqsız edildi*

**improper** [ɪm'prɒpə'] *adj* 1. yaramayan, əl verməyən, əlverişli / münasib olmayan; yaramaz, yaramayan; ~ **food** yararsız yemək/qida; ~ **speech** yersiz nitq; 2. yanlış, düzgün/doğru olmayan; səhv; ~ **sense** səhv /yanlış məna; ~ **use** səhv işlənmə; ~ **accent** səhv vurğu; ~ **treatment of a disease** xəstəliyi yanlış müalicə etmə; ~ **use of a tool** alətdən yanlış istifadə etmə; **to make an ~ use of *one's* time** vaxtından düzgün istifadə etməmək; 3. ədəbsiz, həyasız, nalayiq, yaramaz; ~ **behaviour** ədəbsiz/nalayiq davranış; ~ **language** ədəbsiz/nalayiq danışma; ~ **word** ədəbsiz söz

**improperly** [ɪm'prɒpəlɪ] *adv* 1. yanlış, yanlış olaraq, düzgün olmayaraq, səhv, səhv/ yanlış olaraq; 2. ədəbsiz, ədəbsizcəsinə, həyasız, həyasızcasına; **to act ~** ədəbsiz / həyasız hərəkət etmək; **to behave ~** həyasızcasına davranmaq

**impropriety** [.ɪmprə'praɪətɪ] *n* 1. yersizlik, münasibətsizlik; yaramazlıq, yararsızlıq, gərəksizlik; **the ~ of an expression** hər-hansı bir ifadənin yersizliyi; 2. yanlışlıq / düzgün/doğru olmama; yanlışlıq, xəta, qələt, səhv; *We may say, without impropriety that... Səhvsiz olaraq demək olar*

*ki, ...: The investigation revealed no impropriety Araşdırma heç bir xəta / səhv olmadığını aşkar etdi;* 3. ədəbsizlik, həyasızlıq, ədəbsiz / həyasız hərəkət; **the ~ of her conduct** onun davranışının / hərəkətinin ədəbsizliyi

**improve** [ɪm'pru:v] *v* **1.** yaxşılaşdırmaq, təkmilləşdirmək; **to ~ *smb.'s* conditions** bir kəsin şəraitini yaxşılaşdırmaq; **to ~ *one's* handwriting** özünün xəttini təkmilləşdirmək/yaxşılaşdırmaq; **to ~ the faculties of the mind/of *one's* talent** öz əqli qabiliyyətini/istedadını təkmilləşdirmək; **2.** yaxşılaşmaq, təkmilləşmək; *The trade has improved Ticarət yaxşılaşıb; His spelling has improved Onun yazısı təkmilləşib/ yaxşılaşıb (yəni səhvsiz yazır)*; **to ~ in health** səhhəti yaxşılaşmaq; **3.** istifadə etmək, faydalanmaq; **to ~ *one's* hours of idleness** boş/asudə vaxtından faydalanmaq/yaxşı istifadə etmək; **to ~ each moment as it comes** boş vaxtın hər dəqiqəsindən istifadə etmək; **to ~ a victory** qələbədən faydalanmaq / istifadə etmək; **to ~ the occasion/the opportunity** imkandan istifadə etmək; **4.** torpağı yaxşılaşdırmaq; meliorasiya işi aparmaq; **to ~ virgin land** xam torpaqdan istifadə etmək, xam torpağı becərmək; **to ~ away** yaxşılaşdırmaq əvəzinə pisləşdirmək; ≅ qaş qayırmaq əvəzinə göz çıxartmaq; **to ~ on/upon** yaxşılaşdırmaq, təkmilləşdirmək; *This town has been much improved upon in recent years Son illərdə bu şəhər xeyli abadlaşıb*

**improved** [ɪm'pru:vd] *adj* təkmilləşmiş, təkmilləşdirilmiş, yaxşılaşmış, yaxşılaşdırılmış, mükəmməl, mükəmməlləşdirilmiş; **~ model** mükəmməlləşdirilmiş model/nümunə

**improvement** [ɪm'pru:vmənt] *n* **1.** yaxşılaşma, yaxşılaşdırma; təkmilləşmə, təkmilləşdirmə; **signs of ~** yaxşılaşma əlamətləri/nişanələri; **~ of international relations** beynəlxalq əlaqələrin yaxşılaşması; **~ of *one's* health** səhhətinin yaxşılaşması; **~ in the building** tikilişin təkmilləşdirilməsi; **~ in traffic regulations** küçə hərəkətinin təkmilləşdirilməsi/yaxşılaşdırılması; **to show a great/vast/remarkable ~** çox yaxşılaşmaq/təkmilləşmək; *There has been an improvement in the weather Hava yaxşılaşıb;* **2.** *pl amer.* rahatlıq *(evdə, mənzildə)*; **a house with all modern/up-to-date ~s** hər cür müasir rahatlığı olan ev

**improver** [ɪm'pru:və^r] *n* stajçı *(təcrübə keçən)*; praktikant, təcrübə keçən *(adam)*

**improvidence** [ɪm'prɒvɪdəns] *n* **1.** tədbirsizlik, ehtiyatsızlıq, qeydsizlik, diqqətsizlik; uzağı görməməzlik; **2.** israfçılıq, bədxərclik

**improvident** [ɪm'prɒvɪdənt] *adj* **1.** tədbirsiz, ehtiyatsız, diqqətsiz, bəsarətsiz; uzaq /uzağı görməyən, qafil; **2.** israfçı, israfçıl, bədxərc; **~ local councils** işrafçı/bədxərc yerli bələdiyyə idarələri

**improvidently** [ɪm'prɒvɪdəntlɪ] *adv* **1.** ehtiyatsızlıqla, tədbirsizcəsinə, diqqətsizcəsinə, ehtiyatsız / diqqətsiz bir tərzdə; **2.** bədxərccəsinə, israfçılıqla

**improving** [ɪm'pru:vɪŋ] *n* yaxşılaşma, yaxşılaşdırma, təkmilləşmə, təkmilləşdirmə; *The machine needs improving Maşının təkmilləşdirilməyə ehtiyacı var*

**improvisation** [.ɪmprəvaɪ'zeɪʃn] *n* improvizasiya *(hazırlaşmadan şer/nitq söyləmə, musiqi əsəri yaratma və ya musiqi çalma)*

**improvisator** [ɪm'prɒvɪzeɪtə^r] *n* improvizator *(improvizasiya etmək qabiliyyəti olan adam)*

**improvisatorial** [ɪm.prɒvɪzə'tɔ:rɪəl] *adj* improvizatorluq, improvizator; **~ gift/ talent** improvizatorluq qabiliyyəti/ istedadı

**improvise** ['ɪmprəvaɪz] *v* **1.** improvizasiya etmək, sinədən/bədahətən demək, qabaqcadan hazırlaşmadan nitq söyləmək / şer demək/musiqi çalmaq; hazırlaşmadan bir iş görmək; **2.** tələsik tikmək/ düzəltmək; *I forgot the words of my speech, so I had to improvise Mən danışarkən sözləri unutdum, buna görə də özümdən quraşdırmalı oldum;* **3.** əlaltında olanlardan istifadə edib bir şey hazırlamaq; *She improvised a cake although she had no sugar Şəkəri olmamasına baxmayaraq, o, əlüstü tort bişirdi (yəni şəkərin əvəzinə başqa şirin şeylərdən istfiadə etdi)*; **to ~ a tent out of blankets** yorğanlardan *(istifadə edərək)* çadır düzəltmək; **4.** çalmaq prosesində musiqi əsəri yaratmaq

**improvised** ['ɪmprəvaɪzd] *adj* improvizasiya olunmuş / edilmiş, hazırlıqsız düzəldilmiş /hazırlanmış; **~ meal** tələsik /atüstü hazırlanmış yemək; **~ bridge** tələsik / əlaltında olan şeylərdən tikilmiş körpü; **an ~ speech** hazırlıqsız nitq

**imprudence** [ɪm'pru:dns] *n* ağılsızlıq, düşüncəsizlik, ağılsız / düşüncəsiz hərəkət; diqqətsizlik, tələsiklik, ehtiyatsızlıq, başısoyuqluq; **to have the ~ to do *smth.*** bir şeyi etməkdə ehtiyatsızlıq göstərmək; **to suffer for *one's* ~** öz düşüncəsizliyi/ ehtiyatsızlığı ucbatından əziyyət çəkmək

**imprudent** [ɪm'pru:dnt] *adj* ağılsız, düşüncəsiz; diqqətsiz, ehtiyatsız, başısoyuq; **~ action** ağılsız / ehtiyatsız hərəkət; **~ answer** düşüncəsiz / ehtiyatsız cavab; **~ behaviour/conduct** ağılsız hərəkət / davranış

**imprudently** [ɪm'pru:dəntlɪ] *adv* ağılsız, düşüncəsiz, başısoyuq, ehtiyatsız, ehtiyatsız olaraq

**impudence** ['ɪmpjudns] *n* **1.** abırsızlıq, həyasızlıq, utanmazlıq, ədəbsizlik; qabalıq, qaba hərəkət; sırtıqlıq; **a man of amazing ~** qeyri-adi həyasız/utanmaz adam; **to have the ~ to do / to say *smth.*** bir şeyi etməyə/deməyə həyasızlığı çatmaq/üzü olmaq; *I've had enough of your impudence, young lady! Gənc xanım, sizin həyasızlığınız məni cana gətirib!;* **2.** abırsız/ utanmaz / ədəbsiz / qaba hərəkət



**impudent** ['ɪmpjudnt] *adj* abırsız, həyasız, utanmaz, ədəbsiz, qaba, sırtıq; **an ~ child** ədəbsiz / abırsız uşaq; **an ~ reply** qaba / ədəbsiz cavab; **an ~ action** qaba / sırtıq / ədəbsiz hərəkət; **~ lie** ağ yalan

**impudently** [ɪm'pju:dəntlɪ] *adv* ədəbsizcəsinə, həyasızcasına, həyasız, sırtıq, sırtıqcasına, ədəbsiz, ədəbsizcəsinə, kobud, kobudcasına, qaba, qabacasına

**impugn** [ɪm'pju:n] *v* mübahisə etmək, razı olmamaq, etiraz/höcət etmək; təkzib etmək, yalana çıxartmaq, yalan olduğunu sübut etmək; **to ~ a claim** iddianı qəbul etməmək; **to ~ a statement** bəyanatı təkzib etmək

**impulse**¹ ['ɪmpʌls] *n* **1.** zərbə, təkan, stimul; **the ~ of a wave** dalğanın zərbəsi / təkanı; **to give a strong ~ to *smth.*** bir şeyə güclü təkan vermək; **to give an ~ to trade** ticarətə təkan/stimul vermək; **to give an ~ to education** təhsilin inkişafına təkan/stimul vermək; **2.** *fiziol.* impuls *(qeyri-iradi hərəkət)*; **3.** coşma, coşğunluq; *A sudden impulse of anger arose in him Onun daxilində qəflətən bir qəzəb oyandı;* **to check/to control/to restrain an ~** coşğunluğu cilovlamaq; **4.** arzu, niyyət, meyl; **inward ~** daxili arzu/meyl; **blind ~** kor-koranə arzu / meyl; **creative ~** yaradıcılıq arzusu / meyli; **a man of ~** coşğun / çılğın adam; **to be guided by ~** öz arzusu / inamı ilə hərəkət etmək; **to arouse an ~** arzu / istək doğurmaq

**impulse**² ['ɪmpʌls] *v* təkan/ stimul vermək; vadar/məcbur/təhrik etmək, həvəs oyatmaq

**impulsion** [ɪm'pʌlʃn] *n* **1.** zərbə, təkan; **2.** stimul; arzu, niyyət, məqsəd, meyl

**impulsive** [ɪm'pʌlsɪv] *adj* **1.** impulsiv, qeyri-iradi; tez qızışan / coşan, çılğın; **~ child** çılğın uşaq; **~ nature** çılğın xasiyyət; **2.** hərəkətverici, təkanverici, hərəkətverən, təkanverən; **~ force** hərəkətverici qüvvə

**impulsively** [ɪm'pʌlsɪvlɪ] *adv* impulsiv, qeyri-iradi, qeyri-iradi olaraq

**impunity** [ɪm'pju:nətɪ] *n* **1.** cəzasızlıq, cəzasız qalma, tənbehsizlik; **with ~** cəzasız olaraq; *You can't break the law with impunity Qanunu pozmaq cəzasız qalmaz;* **to insult with ~** təhqirə görə cəzasız qalmaq; **2.** *hüq.* cəzadan azad etmə

**impure** [ɪm'pjuə^r] *adj* **1.** xalis/təmiz olmayan, qarışıq, qarışığı olan; **~ metals** qarışığı olan metal, xalis olmayan metal; **2.** çirkli; **~ air** çirkli hava; **~ water** çirkli su; **3.** ədəbsiz, nalayiq, yaramaz; **~ acts** ədəbsiz /nalayiq / yaramaz hərəkətlər; **~ book** ədəbsiz/nalayiq kitab; **4.** qatışdırılmış; **~ milk** qarışdırılmış süd *(yəni su qatılmış)*; **~ butter** qatışdırılmış yağ; **5.** qarışıq; **~ colour** qarışıq rəng; **6.** səliqəsiz, natamam *(dil, üslub haq.)*; yanlış, düzgün/ doğru olmayan *(ifadə haq.)*

**impurity** [ɪm'pjuərɪtɪ] *n* **1.** çirklilik, çirk; zibillənmə; **~ of air/of water** havanın / suyun çirklənməsi; **~ of language** dilin zibillənməsi; **2.** *məc.* ədəbsizlik, həyasızlıq; **novels full of impurities** ədəbsizliklərlə dolu romanlar; **3.** *adət. pl* qatışıq; **impurities in food** qidanın tərkibində qatışıqlar; **free from impurities** qatışığı olmayan, xalis

**impute** [ɪm'pju:t] *v* təqsirləndirmək, müqəssir etmək, günahkar bilmək, qınamaq; ittiham etmək; aid etmək, adına / ayağına yazmaq; **to ~ blame to *smb.*** günahı bir kəsin ayağına yazmaq; *He was innocent of the crime imputed to him Onun ayağına yazılmış cinayətdə o günahsız idi;* **to ~ *smb.'s* illness to negligence** bir kəsin xəstəliyini laqeyd münasibətlə izah etmək

**in**¹ [ɪn] *n pl:* **the ~s** hakimiyyətdə olan partiya; **the ~s and the outs** iqtidarda olan partiya və müxalifət;

◊ **~s and outs** 1) cik-bik; **to know ~s and outs of a problem** problemin cikini-bikini bilmək; *He's been here for years - he should know the ins and outs of the job by now O, illərlə burada işləyir, -indi o, işin cikini-bikini bilməlidir;* 2) təfərrüat, təfsilat; **to know the ~s and outs of a matter** məsələnin təfsilatını bilmək

**in**² [ɪn] *adj* **1.** iç, daxili, daxildə yerləşən; **2.** daxilə istiqamətlənmiş; **3.** *jarq.* **the ~ party** hakimiyyətdə olan partiya

**in**³ [ɪn] *v dial.* **1.** yığmaq, toplamaq; *In the hay before it rains Yağışlar başlamazdan əvvəl otu yığ/yığın;* **2.** dövrələmək, əhatə etmək, araya/mühasirəyə almaq, çəpərləmək, hasarlamaq

**in**⁴ [ɪn] *adv* **1.** içəridə, daxildə; *Is anyone in? İçəridə bir kəs varmı?;* **2.** evdə; *He is not in today O, bu gün evdə yoxdur;* **3.** içəri; *Come in İçəri gəl/gəlin; Bring him in! Onu içəri gətir / gətirin;* **4.: to be in** 1) gəlmək, çatmaq, gəlib çıxmaq; *The mail is in Poçt gəlib; The harvest is in Məhsul yığılıb; Winter/Spring is in Qış/Yaz gəlib;* 2) qalada/qazamatda/həbsxanada olmaq; *What is he in for? Onu nəyə görə həbs ediblər/qazamata salıblar?;* 3) yanmaq; *Is the fire still in? Ocaq hələ yanırmı?;*

◊ **year ~, year out** ildən ilə, ilbəil, həmişə; **~ and out** 1) gah içəri, gah çölə; 2) növbə ilə, bir-birinin dalınca, bir-birini əvəz edərək; *Now in, now out Gah ora, gah bura;* **to know *smth.* in and out** bir şeyi mükəmməl bilmək; **to be ~ for a competition** konkursda /müsabiqədə iştirak etmək

**in**⁵ [ɪn] *prep* **1.** *Məkan bildirərək aşağıdakı mənalarda işlənir:* 1) *əşyanın bir şeyin içində olduğunu bildirir. Bu halda* **in** *Azərbaycan türkcəsində yerlik hal şəkilçiləri* **–da, -də** *və iç sözünə uyğun gəlir:* **~ a box** qutuda, qutunun içində; **~ the garden** bağda, bağın içində; **~ the street** küçədə; **~ the sky** göydə, səmada; **~ the town** şə-

hərdə; ~ **the North** şimalda; ~ **the distance** uzaqda; ~ **the second chapter** ikinci fəsildə; ~ **this book** bu kitabda; ~ **his speech** onun nitqində; 2) *İstiqamət bildirir. Bu halda* **in** *Azərbaycan türkcəsində yönlük hal şəkilçiləri* **-a, -ə** *və* **iç** *sözlərinə uyğun gəlir:* **to put** *smth.* ~ **the pocket** bir şeyi cibinə qoymaq; *Put the books in the box Kitabları qutuya/qutunun içinə qoy/qoyun!*; 3) *Bir yerə çatmağı / varid olmağı bildirir. Bu halda da* **in** *Azərbaycan türkcəsinə yönlük hal şəkilçiləri* **-a, -ə-ya** *uyğun gəlir:* **to arrive** ~ **a city** şəhərə çatmaq/gəlmək; 2. *Zaman mənası bildirərək aşağıdakı hallarda işlədilir:* 1) *Sutkanın, ilin, əsrin və s. hissələri qarşısında: Bu halda* **in** *Azərbaycan türkcəsinə ya yerlik hal şəkilçiləri* **-da, -də** *vasitəsilə tərcümə edilir, ya da tərcümə edilmir:* ~ **summer** yayda; ~ **winter** qışda; ~ **the morning/ afternoon / evening** səhər/günortadan sonra/axşam; ~ **March /April** martda/ apreldə; ~ **(the year) 1980** 1980-ci ildə; ~ **the 19**[th] **century XIX** əsrdə; ~ **(the) future** gələcəkdə; ~ **the past** keçmişdə; ~ **time** vaxtında; 2) *Hər hansı hərəkətin baş verməsi müddətini bildirir: I'll be ready in an hour Mən bir saata hazır olacam*; ~ **a minute** bir dəqiqədən sonra; *He finished his work in an hour O, işini bir saatdan sonra qurtardı*; 3) *Havanın vəziyyətini bildirir:* ~ **good/bad weather** yaxşı/pis havada; **to go out** ~ **the rain/in the storm** yağışda/tufanda çölə çıxmaq; ~ **the cold** soyuqda; ~ **the wind** küləkdə; ~ **the dark** qaranlıqda; 4) *Fiziki və ruhi vəziyyəti bildirir: He is in good / in bad health O, sağlamdır / xəstədir*; **to be** ~ **good/bad condition** yaxşı/pis vəziyyətdə olmaq; **to be** ~ **love** aşiq olmaq, eşqə düşmək; **to be** ~ **rage** qəzəbli olmaq; 5) *Xarici görkəm, geyim və s. bildirir:* ~ **white** ağ geyimdə; ~ **silk** ipək geyimdə; ~ **brown shoes** palıdı rəngli ayaqqabıda; *What shall I go in? Mən nə geyinim?; b) Səbəb və ya məqsəd bildirir. Bu halda* **in** *əsasən Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçiləri* **-dan, -dən-ə** *uyğun gəlir;* **to cry out** ~ **alarm/in surprise** həyacandan/ təəccübdən qışqırmaq; ~ **answer** /~ **reply** cavab olaraq; ~ *smb.'s* **behalf** kiminsə xeyrinə; 7) *Üsul, tərz və s. bildirir:* ~ **haste** tələsik; ~ **a few words** bir neçə sözlə; **to speak** ~ **a low/** ~ **a loud voice** alçaq/yüksək səslə danışmaq; **to talk** ~ **whispers/~a whisper** pıçıltı ilə danışmaq; ~ **the Chinese style** Çin üslubunda; 8) *Şəxslərin, şeylərin yerləşmə qaydasını bildirir:* ~ **rows** cərgə ilə; ~ **groups** qruplarla; ~ **pairs** cüt-cüt, qoşa-qoşa; ~ **alphabetical order** əlifba sırası ilə;

◊ **blind** ~ **one eye** bir gözdən kor; ~ **nature** təbiətcə; *She is a child in nature O, təbiətcə uşaqdır*; **rich** ~ **oil** neftlə zəngin; *He is weak in physics O, fizikadan zəifdir; She is superior to me in knowledge O, bilikdə məndən üstündür; These words differ/are different in meaning Bu sözlər mənaca fərqlənir/fərqlidir; They are equal in strength Onlar gücdə bərabərdirlər*; **to surpass / to exceed** ~ *smth.* bir şeydə üstün olmaq; **a lecture/ an examination** ~ **physics** fizikadan mühazirə / imtahan; *He is a specialist in history O, tarix fənni üzrə mütəxəssisdir*; 3. *Bir işdə iştirakı bildirir:* **to take part** ~ *smth.* bir şeydə iştirak etmək; **to help / to assist** ~ *smth.* bir şeydə kömək etmək; **to interfere/to meddle** ~ *smth.* bir şeyə müdaxilə etmək/qarışmaq; **to join** ~ *smth.* bir şeyə qoşulmaq; 4. *Bir şeyə/kəsə inam /etibar göstərir:* **-a, -ə**; **to believe** ~ *smb.* bir kəsə inanmaq; **to have trust** ~ *smb.* bir kəsə etibar etmək; 5. *İş yerini, müəyyən bir qrupa mənsubiyyəti bildirir:* **-da, -də**; **to be** ~ **the army** əsgərlikdə olmaq; **to work** ~ **an office** ofisdə işləmək; **to be engaged** ~ **trade** ticarətlə məşğul olmaq; 6. *Əşyanın hansı materialdan hazırlandığını bildirir:* **-dan, -dən**; **a statue** ~ **marble /wood** mərmərdən/ağacdan heykəl; 7. *İş zamanı istifadə edilən materialı bildirir:* **-la, -lə, ilə**; **to paint** ~ **oil** yağlı boya ilə çəkmək *(şəkli)*; **to write** ~ **pencil/ink** karandaşla/mürəkkəblə yazmaq; 8. *Danışılan və ya yazılan dili bildirir:* **-ca, -cə**; ~ **Russian** rusca; ~ **English** ingiliscə; **to write** ~ **Russian/ English** rusca/ingiliscə yazmaq; 9. *Sözün qrammatik mənasından danışarkən işlənir:* **-da, -də**; ~ **the singular** təkdə; ~ **the nominative case** adlıq halda; 10. *Aşağıdakı ifadələrdə işlənir:* ~ **case** əgər, işdir; *In case I'm late, wait for me at the bus-stop Əgər / İşdir geciksəm, məni avtobus dayanacağında gözlə/gözləyin*; ~ **front of** qarşısında; *He stood in front of the window O, pəncərənin qarşısında dayandı*; ~ **order** üçün, ötrü, ki; *I came all the way just in order to see you Mən bütün bu yolu gəldim ki, yalnız səni / sizi görüm*; ~ **spite of** baxmayaraq ki; *In spite of this I believe him Buna baxmayaraq, mən ona inanıram*

**inability** [ˌɪnəˈbɪlɪtɪ] *n* qabiliyyətsizlik, bacarıqsızlıq; imkansızlıq; acizlik; ~ **to pay** borcu ödəyə bilməmə; **the** ~ **of poor families to obtain medical treatment** kasıb ailələrin tibbi müalicə almaq imkansızlığı; ~ **to work alone** təkbaşına işləmə bacarıqsızlığı

**inaccessibility** [ˈɪnæk.sesəˈbɪlɪtɪ] *n* alınmazlıq, əlçatmazlıq; imkansızlıq

**inaccessible** [ˌɪnækˈsesəbl] *adj* **1.** əlçatmaz; **a remote and** ~ **region** uzaq və əlçatmaz rayon; **2.** alınmaz, əldə edilməz; çox təkəbbürlü; çox ciddi; adamdanqaçan, adamayovuşmaz, cəmiyyətdən qaçan; qaradinməz; **3.** *məc.* **(to)** çətin, anlaşılmaz; **philosophical theories that are** ~ **to most of us** bizlərdən çoxu üçün anlaşılmaz olan fəlsəfi nəzəriyyələr

**inaccuracy** [ɪnˈækjurəsɪ] *n* **1.** səliqəsizlik, diqqətsizlik, dürüst/düz olmama, yanlışlıq; **2.** səhv,



qələt, xəta; qeyri-dəqiqlik; **an** ~ **in the use of terms** terminlərin işlənilməsində səhv/xəta; **the** ~ **of the information** məlumatın qeyri-dəqiqliyi

**inaccurate** [ɪnˈækjurɪt] *adj* səhv, yanlış, düz /dürüst/doğru olmayan; ~ **statement** səhv / yanlış məlumat

**inaccurately** [ɪnˈækjurɪtlɪ] *adv* səhvən, yanlış / səhv olaraq

**inaction** [ɪnˈækʃn] *n* hərəkətsizlik, fəaliyyətsizlik

**inactive** [ɪnˈæktɪv] *adj* **1.** fəaliyyətsiz, hərəkətsiz, passiv, süst; ətalətli, tənbəl; ~ **life** passiv həyat; ~ **person** passiv/tənbəl adam; **to be** ~ fəaliyyətsiz olmaq; *Some animals are inactive during the daytime Bəzi heyvanlar gündüz vaxtı fəaliyyətsiz olurlar*; **2.** işləməyən, fəaliyyətsiz olan, istifadəsiz; ~ **station** işləməyən stansiya; ~ **machine** işləməyən / istifadəsiz maşın; **3.** *hərb.* ehtiyatda olan; ~ **list** ehtiyatda olan komanda heyətinin siyahısı; **4.** *kim.* təsirsiz *(qaz və s. haq.)*

**inactivity** [ˌɪnækˈtɪvɪtɪ] *n* fəaliyyətsizlik, hərəkətsizlik, passivlik, süstlük; tənbəllik, ətalət

**inadequacy** [ɪnˈædɪkwəsɪ] *n* əsassızlıq, tutarsızlıq, keyfiyyətsizlik; **the** ~ **of a reply** cavabın tutarsızlığı; ~ **for work** işə yaramama

**inadequate** [ɪnˈædɪkwɪt] *adj* **1.** tələbə cavab verməyən, yaramayan; qeyri-qənaətbəxş, qeyri-kafi; uyğunsuz, tənasübsüz, əndazəsiz; adekvat olmayan; ~ **compensation** qeyri-kafi/uyğun olmayan kompensasiya; ~ **supplies** qeyri-kafi təminat; ~ **preparation** qeyri-qənaətbəxş hazırlıq; ~ **resources** qeyri-qənaətbəxş ehtiyat/ vəsait; **2.** anormal, qeyri-normal, normal olmayan; ~ **child** anormal uşaq

**inadequately** [ɪnˈædɪkwɪtlɪ] *adv* az, qeyri-kafi, kifayət etməyəcək dərəcədə, yetişməyəcək qədər / dərəcədə, qeyri-uyğun bir şəkildə / tərzdə, əndazəsiz, əndazəsiz olaraq; **to be** ~ **prepared** kifayət qədər hazırlanmamış

**inadherent** [ˌɪnədˈhɪərənt] *adj* rabitəsiz, dolaşıq, bir-birini tutmayan, bir-birinə uyuşmayan *(fikir, nitq və s. haq.)*

**inadmissibility** [ˈɪnəd.mɪsəˈbɪlɪtɪ] *n* yolverilməzlik, dözülməzlik

**inadmissible** [ˌɪnədˈmɪsəbl] *adj* yolverilməz, dözülməz; qəbuledilməz, qəbuledilə bilməyən, əlverməz; ~ **proposal** qəbuledilməz/qəbul edilə bilməyən təklif

**inadvertence** [ˌɪnədˈvəːtəns] *n* diqqətsizlik; laqeydsizlik, etinasızlıq, saymazlıq; hörmətsizlik; səliqəsizlik; **by** ~ diqqətsizlik / etinasızlıq ucbatından; *All these mistakes proceed from inadvertance Bütün bu səhvlər diqqətsizliyin/laqeydliyin/etinasızlığın nəticəsidir*; **to do** *smth.* **through** ~ bir şeyi diqqətsizlik/saymazlıq ucbatından səhv etmək; **to suffer for** *smb.'s* ~ bir kəsin diqqətsizliyi/laqeydliyi ucbatından əziyyət çəkmək

**inadvertent** [ˌɪnədˈvəːtənt] *adj* **1.** diqqətsiz, huşsuz; etinasız, saymaz, ehtiramsız, hörmətsiz; səliqəsiz, laqeyd; ehtiyatsız; ~ **step** ehtiyatsız addım; **2.** qəsdsiz, qeyri-ixtiyari, bilmədən edilmiş; təsadüfi, naqafil; ~ **act** qəsdsiz/qeyri-ixtiyari hərəkət; ~ **meeting** təsadüfi görüş / görüşmə; **an** ~ **slip** bilmədən edilmiş səhv

**inadvertently** [ˌɪnədˈvəːtəntlɪ] *adv* diqqətsizlikdən, diqqətsizlik/laqeydlik ucbatından, təsadüfən, qeyri-ixtiyari; *I brought back his keys which I had inadvertently put in my pocket Mən onun diqqətsizlik ucbatından cibimə qoyduğum açarını geri qaytardım*

**inadvisable** [ˌɪnədˈvaɪzəbl] *adj* məqsədə uyğun olmayan, səmərəsiz, faydasız; ağılsız; məsləhət görülməyən/bilinməyən/olmayan; *It's inadvisable to go there now İndi oraya getmək məsləhət deyil*

**inalienability** [ɪn.eɪljənəˈbɪlɪtɪ] *n* ayrılmazlıq, ayrıla bilməməzlik

**inalienable** [ɪnˈeɪljənəbl] *adj* alınmaz, alına bilməz, alınması mümkün olmayan; ~ **rights** alınmaz/alınması mümkün olmayan hüquqlar

**inane** [ɪˈneɪn] *adj* **1.** sarsaq, səfeh, axmaq, gic, ağılsız; başıboş, yelbeyin; boş, mənasız, əhəmiyyətsiz; məzmunsuz; ~ **and tiresome book** məzmunsuz / mənasız və yorucu kitab; ~ **person** boş/əhəmiyyətsiz adam; ~ **remark** boş /mənasız irad; ~ **question** boş / mənasız sual; ~ **smile** gic / mənasız təbəssüm; **2.** boş, tutulmamış; ~ **space** boş məkan

**inanely** [ɪˈneɪnlɪ] *adv* gic-gic, axmaqcasına, axmaq-axmaq, boş-boş, mənasız-mənasız; **to speak** ~ gic-gic/axmaq-axmaq danışmaq

**inanimate** [ɪnˈænɪmɪt] *adj* **1.** cansız; ~ **matter** cansız materiya; ~ **nature** cansız təbiət; ~ **nouns** cansız isimlər; *A rock is an inanimate noun Qaya cansız isimdir*; **2.** ölü, ölüvay, ölgün; sönük, süst, maraqsız; ~ **corpse** cansız cəsəd; ~ **face / look** ölgün sifət/baxış; ~ **market** sönük/süst bazar; ~ **conversation** maraqsız söhbət

**inanimation** [ɪn.ænɪˈmeɪʃn] *n* **1.** cansızlıq; **2.** ölülük, ruhsuzluq; süstlük, fəaliyyətsizlik; passivlik, laqeydsizlik

**inanition** [ˌɪnəˈnɪʃn] *n* **1.** üzülmə, arıqlama, əldən düşmə; üzgünlük, yorğunluq; ~ **of the body** orqanizmin üzülməsi / əldən düşməsi; **to perish of** ~ üzülmədən / üzgünlükdən ölmək; **2.** boşluq; mənasızlıq; keyfiyyətsizlik, pislik

**inanity** [ɪˈnænɪtɪ] *n* **1.** boşluq, mənasızlıq, keyfiyyətsizlik; tutarsızlıq, səthilik, məzmunsuzluq; **to treat a problem with** ~ problemə səthi / qeyri-ciddi yanaşmaq; **2.** axmaqlıq, giclik, səfehlik

**inapplicable** [ɪnˈæplɪkəbl] *adj* tətbiq edilə bilməyən, yararsız, yaramaz, gərəksiz; uyğungəlməyən; ~ **means** yararsız / gərəksiz vasitələr; *The rule is inapplicable to this case Bu məsələyə bu qanun tətbiq edilə bilməz*

**inappreciable** [ˌɪnəˈpriːʃəbl] *adj* görünməyən, seçilməyən, hiss edilməyən, nəzərə çarpmayan; çox az / xırda; ~ **difference** hiss edilməyən/nəzərə çarpmayan fərq; ~ **particle** çox xırda hissəcik; ~ **quantity** çox az miqdar; **an ~ amount of money** çox az miqdar pul

**inappreciably** [ˌɪnəˈpriːʃəblɪ] *adv* çox az / xırda/kiçik, hiss edilməyəcək dərəcədə; **an ~ small increase** çox cüzi artım

**inappreciation** [ˈɪnəˌpriːʃɪˈeɪʃn] *n* qiymət verməmə, lazımi qədər qiymətləndirməmə

**inappreciative** [ˌɪnəˈpriːʃətɪv] *adj* qiymət verməyən, əsl qiymətini başa düşməyən

**inapprehensible** [ˌɪnæprɪˈhensəbl] *adj* anlaşılmayan, anlaşılmaz, başa düşülməyən, müəmmalı; dərkedilməz, ağlasığmaz

**inapprehension** [ˌɪnæprɪˈhenʃn] *n* anlamama, anlaşılmama, başa düşməmə/düşülməmə, dərk etməmə / edilməmə

**inapproachable** [ˌɪnəˈproutʃəbl] *adj* alınmaz, əldə edilməz, əlçatmaz; möhkəm, sarsılmaz

**inappropriate** [ˌɪnəˈproupriɪt] *adj* yersiz, münasibətsiz, yaramayan, əlverişsiz, əlverişli/münasib olmayan, yaraşmayan, uyğun gəlməyən / olmayan; **clothes ~ to the season** mövsümə uyğun olmayan/yaraşmayan paltar; **an ~ name** yaraşmayan / yaramayan ad; **an ~ moment** əlverişsiz / əlverişli olmayan an

**inappropriately** [ˌɪnəˈproupriɪtlɪ] *adv* yersiz, yersiz olaraq, münasibətsiz, münasibətsiz olaraq; uyğun/ müvafiq olmayaraq

**inapt** [ɪnˈæpt] *adj* **1.** yersiz, münasibətsiz; uyğun olmayan / gəlməyən; ~ **remarks** yersiz iradlar; ~ **analogy** yersiz / uyğun gəlməyən bənzətmə; **2.** təcrübəsiz, bacarıqsız; ~ **mechanic** təcrübəsiz / bacarıqsız mexanik

**inaptitude** [ɪnˈæptɪtjuːd] *n* **1.** yersizlik, münasibətsizlik; yaramazlıq, yararsızlıq; gərəksizlik; uyğunsuzluq; **2.** bacarıqsızlıq, qabiliyyətsizlik, iqtidarsızlıq, acizlik

**inaptly** [ɪnˈæptlɪ] *adv* yersiz, yersiz olaraq, münasibətsiz, münasibətsiz olaraq

**inarable** [ɪnˈærəbl] *adj k.t.* əkinə yararsız; ~ **soil** əkinə yararsız torpaq

**inarm** [ɪnˈaːm] *v* qucaqlamaq, qucağına almaq

**inarticulate** [ˌɪnaːˈtɪkjulɪt] *adj* **1.** anlaşılmaz, qarışıq, aydın olmayan, yaxşı eşidilməyən/seçilməyən; ~ **speech** anlaşılmaz / çətin anlaşılan nitq; ~ **cries** yaxşı eşidilməyən/seçilməyən qışqırtılar; ~ **groan** yaxşı eşidilməyən inilti; ~ **mutter** anlaşılmaz donquldanma; **2.** dinməz, danışmaz, azdanışan, sakit; lal, nitqsiz, dilsiz, dilsiz-ağızsız; ~ **animal** dilsiz/dilsiz-ağılsız heyvan; *He's inarticulate with the palsy İflicdən onun dili tutulub*

**inarticulately** [ˌɪnaːˈtɪkjulɪtlɪ] *adv* anlaşılmaz / çətin anlaşılan bir tərzdə

**inarticulation** [ˌɪnaːˈtɪkjuˈleɪʃn] *n* anlaşılmaz artikulyasiya *(müəyyən bir səsin çıxarılması üçün danışıq orqanlarının gördüyü işlər)*; anlaşılmaz / çətin başa düşülən nitq

**inattention** [ˌɪnəˈtenʃn] *n* diqqətsizlik, etinasızlıq, saymazlıq, ehtiramsızlıq, hörmətsizlik; qayğısızlıq

**inattentive** [ˌɪnəˈtentɪv] *adj* diqqətsiz; etinasız, saymaz, ehtiramsız, hörmətsiz; **an ~ audience** diqqətsiz/etinasız tamaşaçılar; ~ **to the needs of others** başqalarının ehtiyacına etinasızlıq / diqqətsizlik

**inattentively** [ˌɪnəˈtentɪvlɪ] *adv* diqqətsiz, diqqətsizliklə, diqqətsiz bir tərzdə, etinasızlıqla, ehtiramsızlıqla, saymazyana

**inaudibility** [ɪnˌɔːdəˈbɪlɪtɪ] *n* pis eşidilmə; yaxşı eşidilməmə, aydın olmama; anlaşılmama

**inaudible** [ɪnˈɔːdəbl] *adj* yaxşı eşidilməyən, aydın olmayan; anlaşılmaz; ~ **whisper** yaxşı eşidilməyən pıçıltı; **to speak in almost ~ whisper** güclə eşidilən pıçıltı ilə danışmaq

**inaudibly** [ɪnˈɔːdəblɪ] *adv* anlaşılmaz bir tərzdə, eşidilməyəcək dərəcədə, yavaşdan, astadan

**inaugural** [ɪˈnɔːgjərəl] *adj* giriş; ~ **speech** giriş nitqi; ~ **lecture** giriş mühazirə

**inaugurate** [ɪˈnɔːgjəreɪt] *v* **1.** təntənəli surətdə vəzifəyə gətirmək; **to ~ the President** *amer.* prezidenti təntənəli şəkildə hakimiyyətə gətirmək; **2.** başlamaq, açmaq; **to ~ a conference** konfransı başlamaq; *The moon landing inaugurated a new era in space exploration Ayın səthinə enmə fəzanın tədqiq edilməsində yeni dövr açdı*

**inauguration** [ɪˌnɔːgjuˈreɪʃn] *n* **1.** təntənəli surətdə hakimiyyətə / vəzifəyə gətirmə; **2.** təntənəli açılış, başlanğıcı qeyd etmə

**inauspicious** [ˌɪnɔsˈpɪʃəs] *adj* uğursuz, nəhs, arzu edilməyən, əlverişsiz, yaramayan, pislikdən xəbər verən; ~ **beginning** uğursuz başlanğıc; **an ~ occasion** arzu edilməyən / əlverişsiz hadisə / əhvalat; **an ~ meeting** arzu edilməyən görüş

**inauspiciously** [ˌɪnɔsˈpɪʃəslɪ] *adv* uğursuz, nəhs, pis, uğursuzluqla

**inbent** [ˈɪnbent] *adj* çökük, batıq, əyilmiş *(içəri)*

**in-between**[1] [ˌɪnbɪˈtwiːn] *n* **1.** vasitəçi, araçı; dəllal; aradüzəldən *(adam)*; **2.** ara, aralıq

**in-between**[2] [ˌɪnbɪˈtwiːn] *adj* aralıqdakı, aradakı, ortadakı; ara, aralıq

**in-born** [ˈɪnˈbɔːn] *adj* anadangəlmə, fitri; təbii; ~ **ability** anadangəlmə/fitri bacarıq / qabiliyyət; ~ **talent for music** musiqiyə anadangəlmə/fitri istedad

**inbred** [ˈɪnbred] *adj* anadangəlmə, fitri, təbii; ~ **curiosity** təbii olaraq hər şeyi öyrənmək həvəsi

**incalculable** [ɪnˈkælkjuləbl] *adj* **1.** saysız-hesabsız, saya-hesaba gəlməyən, son dərəcə çox, hədsiz, qədərsiz, bitməz-tükənməz; ~ **losses** saysız-hesabsız/saya-hesaba gəlməyən itki; ~ **number of people** saysız-hesabsız / son dərəcə çox adam; **2.** etibarsız, etibar oluna bilməyən; dəyişkən; **a person of ~ moods** dəmdəməki / hərdəmxəyal adam



**incalculably** [ɪnˈkælkjuləblɪ] *adv* saysız-hesabsız dərəcədə, sayagəlməz bir surətdə, son dərəcə çox

**in-calf** [ɪnˈkaːf] *adj k.t.* boğaz *(inək haq.)*

**incalver** [ɪnˈkaːlvə] *n k.t.* boğaz inək

**incandescence** [ˌɪnkænˈdesns] *adj* közərtmə, közərmə; közərənə qədər qızdırma

**incandescent** [ˌɪnkænˈdesnt] *adj* **1.** közərmiş, közərdilmiş; bərk qızdırılmış/qızmış; **2.** gözqamaşdıran, parlaq, parıldayan, bərq vuran; ~ **snow** gözqamaşdıran/gözqamaşdırıcı qar; ~ **lights** parlaq/gözqamaşdırıcı işıqlar; **3.** *məc.* alovlanan, alovla yanan; qızğın; *She was incandescent with rage O, qəzəbdən/qeyzdən alovlanırdı/yanırdı*; ~ **passion** qızğın ehtiras

**incantation** [ˌɪnkænˈteɪʃn] *n* **1.** ovsun, cadu, sehr; ovsunlama, cadulama; **2.** cadugərlik, sehrbazlıq, ovsunçuluq; **to chant ~s towards off evil spirits** şər qüvvələri ovsunlamaq / cadulamaq

**incapability** [ɪnˌkeɪpəˈbɪlɪtɪ] *n* **1.** qabiliyyətsizlik, bacarıqsızlıq, iqtidarsızlıq, acizlik; **2.** *hüq.* vətəndaşlıq hüququ olmama

**incapable** [ɪnˈkeɪpəbl] *adj* **1.** qabiliyyətsiz, bacarıqsız; aciz; **thoroughly ~** tam qabiliyyətsiz; ~ **helper** aciz / bacarıqsız köməkçi; ~ **of understanding** anlamağa qabil olmayan; ~ **to lie/of a lie/of telling a lie** yalan danışmağı bacarmayan; *I'm incapable of deceiving you Mən səni / sizi aldada bilmərəm*; **2.** *hüq.* vətəndaşlıq hüququ olmayan

**incapacious** [ˌɪnkəˈpeɪʃəs] *adj* **1.** tutumsuz, dar, ensiz; **2.** dardüşüncəli, darfikirli, korazehin, anlamaz, fəhmsiz

**incapacitate** [ˌɪnkəˈpæsɪteɪt] *v* **1.** yararsızlaşdırmaq, qabiliyyətini/bacarığını əlindən almaq; **to ~ *smb.* for work/from working** bir kəsi işə yararsız hala salmaq; **2.** qabiliyyətini/bacarığını itirmək; **to be ~d by old age and sickness** qocalıqdan və xəstəlikdən iş qabiliyyətini itirmək; **3.** *hüq.* hüququnu məhdudlaşdırmaq; **to be ~d from voting** seçki /səsvermə hüququndan məhrum etmək

**incapacity** [ˌɪnkəˈpæsɪtɪ] *n* qabiliyyətsizlik, bacarıqsızlıq; iqtidarsızlıq, acizlik

**incarcerate** [ɪnˈkaːsəreɪt] *v* həbs etmək, həbsə /qalaya salmaq; *He was incarcerated for five years Onu beş il həbsə saldılar*

**incarceration** [ɪnˌkaːsəˈreɪʃn] *n* həbsə/ qazamata salma, həbs etmə

**incarnate**[1] [ˈɪnkaːnət] *adj* təmsil olunmuş, təcəssüm etdirilmiş, şəxsləndirilmiş; konkret şəkil verilmiş, bədii surətdə ifadə olunmuş

**incarnate**[2] [ˈɪnkaːneɪt] *v* **1.** göstərmək, canlandırmaq, ifadə etmək, konkret şəkil vermək, təcəssüm etdirmək, şəxsləndirmək; *Egyptians incarnated gods in the form of various animals Misirlilər allahları müxtəlif heyvanlar şəklində/formasında təcəssüm etdirdilər*; **2.** həyata keçirmək, yerinə yetirmək *(arzunu, planı, ideyanı və s.)*

**incarnation** [ˌɪnkaːˈneɪʃn] *n* **1.** təcəssüm / ifadə etmə; təmsil olunma, real bir şəkil alma; mücəssəmə; *She is the incarnation of selfishness O, eqoizm mücəssəməsidir*; **2.** *tib.* sağalma; qranulyasiya *(yaranın tədricən təzə toxumalarla örtülməsi, bitişməsi)*

**incaution** [ɪnˈkɔːʃn] *n* ehtiyatsızlıq, diqqətsizlik, laqeydlik, tədbirsizlik; ehtiyatsız hərəkət

**incautious** [ɪnˈkɔːʃəs] *adj* diqqətsiz, ehtiyatsız, laqeyd, tədbirsiz, qayğısız; başısoyuq; ~ **act/step** ehtiyatsız/hərəkət/addım; ~ **talk** boş danışıq; ~ **reader** diqqətsiz / başısoyuq oxucu

**incautiously** [ɪnˈkɔːʃəslɪ] *adv* ehtiyatsız, diqqətsiz, ehtiyatsız/diqqətsiz olaraq, laqeydcəsinə, laqeyd/ başısoyuq bir tərzdə

**incendiary**[1] [ɪnˈsendɪərɪ] *n* **1.** qəsdən yandıran; **2.** təhrikçi, qızışdıran, qızışdırıcı; qiyamçı; **3.** *hərb.* hərbi yandırıcı vasitə

**incendiary**[2] [ɪnˈsendɪərɪ] *adj* **1.** yandırıcı; ~ **bullet** *hərb.* yandırıcı güllə; ~ **bomb** yandırıcı bomba; **2.** təhrikçi, qızışdırıcı, təfriqə salan; ~ **words** qızışdırıcı / təfriqə salan sözlər

**incense**[1] [ˈɪnsens] *n* **1.** buxur *(ətirli maddə)*; xoş iy/ətir, gözəl qoxu; **2.** *məc.* yaltaqlıq, yaltaqcasına tərif, mədh

**incense**[2] [ˈɪnsens] *v* I **1.** buxur yandırmaq; buxurdanı yelləmək; **2.** *məc.* yaltaqlanmaq, yaltaqlıq etmək, yaltaqlıqla tərif / mədh etmək

**incense** [ˈɪnsens] *v* II qəzəbləndirmək, qəzəb oyatmaq, həyacanlandırmaq, qızışdırmaq, coşdurmaq; *I was incensed by him O, məni qəzəbləndirdi*; **to be ~d against *smb.*** bir kəsə qarşı amansız olmaq; **to be ~d at *smb.*'s remarks** bir kəsin iradlarından qəzəblənmək

**incensory** [ˈɪnsensərɪ] *n* buxurdan *(pravoslav və katolik ayinlərində buxur yandırılan qab)*

**incentive**[1] [ɪnˈsentɪv] *n* oyadıcı/sövqedici motiv, stimul; **the true ~ to scientific research** elmi işə/tədqiqata həqiqi stimul / sövqedici motiv; **to offer *smth.* as an ~** bir şeydən stimul kimi istifadə etmək

**incentive**[2] [ɪnˈsentɪv] *adj* **1.** vadaredici, sövqedici, stimulverən; ilhamverən, ilhamverici, ruhlandırıcı; ~ **speech** ilhamverici/ruhlandırıcı nitq; **2.** həvəsləndirici, rəğbətləndirici, şirnikdirici; ~ **pay** həvəsləndirici / şirnikdirici haqq / muzd

**incept** [ɪnˈsept] *v* başlamaq, girişmək, qoşulmaq

**inception** [ɪnˈsepʃn] *n* başlanğıc, əvvəl; *He has been director of the project since its inception Başlanğıcdan o, bu layihənin rəhbəri olub*

**incessable** [ɪnˈsesəbl] *adj* arasıkəsilməz, arasıkəsilməyən, fasiləsiz, aramsız, dalbadal; **a week of almost ~ rain** təxminən bir həftə aramsız / fasiləsiz yağan yağış; **an ~ stream of workers** fəhlələrin arasıkəsilməz axını

**incessancy** [ɪn'sesənsɪ] *n* arasıkəsilməzlik, fasiləsizlik, aramsızlıq, ara verməzlik

**incessant** [ɪn'sesnt] *adj* arasıkəsilməz, arasıkəsilməyən, fasiləsiz, aramsız, dalbadal; sonsuz, həmişəlik, daimi; **~ rains** arasıkəsilməz/fasiləsiz/ aramsız yağışlar; **~ storm** fasiləsiz/aramsız tufan; **~ chatter** aramsız/sonsuz boşboğazlıq; **~ complaints** aramsız / fasiləsiz şikayətlər; **~ pains** aramsız/arasıkəsilməz/daimi ağrılar; **the ~ roar of the fall** şəlalənin aramsız / fasiləsiz şırıltısı / gurultusu

**incessantly** [ɪn'sesntlɪ] *adv* arası kəsilmədən, fasiləsiz, aramsız, fasiləsiz/aramsız olaraq; durmadan, dalbadal; sonsuz, intəhasız; sonsuz/intəhasız olaraq, daimi, daimi olaraq; **to quarrel ~** aramsız/fasiləsiz/ sonsuz olaraq mübahisə etmək

**incest** ['ɪnsest] *n* yaxın qohumlar *(qardaşla bacı, ata ilə qız)* arasında cinsi əlaqə

**inch[1]** [ɪntʃ] *n* **1.** düym *(23 millimetrə bərabər ölçü vahidi)*; **an ~ thick/long** bir düym qalınlığında / uzunluğunda; **an ~ of snow** bir düym qalınlığında qar; **an atmospheric pressure of 30 ~es** 30 düym atmosfer təzyiqi; *She is five feet six inches tall Onun boyu beş fut altı düymdür*; **to the depth of an ~** bir düym dərinliyində; **2.** çox yaxın zamanda, çox az məsafədə / miqdarda və ya miqdarda; **within an ~** çox yaxında; **to watch *smb.* at an ~** bir kəsi çox yaxından müşahidə etmək;
◊ **~ by ~, by ~es** az-az, yavaş-yavaş, tədricən, xırda-xırda; **to die by ~es** yavaş-yavaş ölmək; *They climbed the steep mountain inch by inch Onlar sıldırım dağa yavaş-yavaş dırmaşdılar*; **every ~ 1)** bütünlükdə, tamamilə, başdan ayağa kimi; *He is noble every inch of him O, hər cəhətdən alicənab adamdır*; **2)** əsl, xalis; *He is every inch a soldier O, əsl əsgərdir*; *Give him an inch and he'll take a yard/a mile* ≅ *Ona üz versən, astar da istəyəcək*

**inch[2]** [ɪntʃ] *v* yavaş-yavaş hərəkət etmək; **to ~ *one's* way forward** yavaş-yavaş irəli hərəkət etmək / irəliləmək

**inchoate[1]** [ɪn'kouɪt] *adj* **1.** başlanğıc; ilk, yeni başlayan; erkən; doğulan; **the ~ thawing of snow** qarın erkən əriməsi; **2.** inkişaf etməmiş, geridə qalmış; rüşeym halında olan; *He was all inchoate O, heç inkişaf etməmişdi*

**inchoate[2]** ['ɪnkoueɪt] *v* başlamaq, əsasını qoymaq *(bir şeyin)*

**incidence** ['ɪnsɪdəns] *n* **1.** təsir / əhatə etmə dairəsi; qavrama, cəlb olunmanın əhatə dairəsi; **~ of taxation** vergiyə cəlb olunma; *What is the incidence of the tax Vergiyə kimlər cəlb olunur?*; **the ~ of a disease** xəstəliyin əhatə dairəsi; **an area with a high ~ of crime** cinayətin yüksək olduğu ərazi; **2.** *fiz.* düşmə *(işıq haq.)*; **the angle of ~** düşmə bucağı

**incident[1]** ['ɪnsɪdənt] *n* **1.** hadisə, əhvalat, insident; **frontier/border ~s** sərhəd münaqişələri; **daily ~s** gündəlik hadisələr / əhvalatlar; **to misinterpret an ~** hadisəni /əhvalatı yanlış izah etmək; **to lead up to an ~** insidentə gətirib çıxarmaq, insident yaratmaq; *The demonstration proceeded without incident Nümayiş insidentsiz keçdi*; **2.** epizod; **an ~ in a play** pyesdə bir epizod

**incident[2]** ['ɪnsɪdənt] *adj* **1. (to)** xarakterik / səciyyəvi / xas olan; **diseases ~ to childhood** uşaqlıq dövrü üçün səciyyəvi olan xəstəliklər; **dangers ~ to travel** səyahət üçün xarakterik olan təhlükələr; **2.** təsadüfi, əsas olmayan, ikinci dərəcəli, əhəmiyyətsiz; əlavə; **3.** *fiz.* düşən; **~ rays** düşən şüalar

**incidental[1]** [ˌɪnsɪ'dentl] *n əsasən pl* xırda-para işlər; **the expenses on cigarettes and ~s** siqaret və xırda-para işlər üçün xərclik

**incidental[2]** [ˌɪnsɪ'dentl] *adj* **1. (to)** xas, məxsus, xas / məxsus olan; aid; **ills ~ to old age** qocalığa xas olan nasazlıq/xəstəlik; *Certain discomforts are incidental to travelling Səyahət zamanı müəyyən narahatlıqlar olur*; **2.** təsadüfi, əhəmiyyətsiz, ikinci dərəcəli, əlavə; **~ advantage** cüzi üstünlük; **~ conversation** təsadüfi söhbət; **~ expenses** əlavə xərclər; **3.** gözlənilməz, təsadüfi; **~ acquaintance** gözlənilməz / təsadüfi tanışlıq;
◊ **~ music** tamaşanı, filmi və s. müşayiət edən musiqi

**incidentally** [ˌɪnsɪ'dentlɪ] *adv* **1.** təsadüfi olaraq, təsadüfən, ittifaqən, bilmədən; **to mention *smth.* ~** bir şeyi təsadüfən xatırlatmaq; **2.** yeri /ağlıma gəlmişkən

**incinerate** [ɪn'sɪnəreɪt] *v* **1.** külə döndərmək, kül etmək; yanıb kül olmaq, tamamilə yanmaq; **2.** *amer.* yandırmaq *(meyiti)*; **to have *one's* body ~d** yandırılmaq *(meyit haq.)*

**incineration** [ɪnˌsɪnə'reɪʃn] *n* **1.** yandırma, külə döndərmə; yanma; **2.** *amer.* kremasiya *(meyitlərin xüsusi peçlərdə yandırılması)*; **to be present at an ~** kremasiya mərasimində iştirak etmək

**incinerator** [ɪn'sɪnəreɪtə[r]] *n* **1.** zibil yandıran; tullantıları yandırmaq üçün peç; **2.** *amer.* krematori *(meyit yandırılan bina)*

**incipient** [ɪn'sɪpɪənt] *adj* başlanan, üzə çıxan, başlayan; **signs of ~ unrest** başlanan narahatçılığın əlamətləri/işarələri; **the ~ stage of fever** qızdırmanın başlanğıc mərhələsi

**incise** [ɪn'saɪz] *v* **1.** kəsmək, çərtmək *(üzdən)*, **2.** oymaq, qazımaq, həkk etmək, naxış açmaq; **to ~ a copper plate** mis lövhəciyin üzərində naxış açmaq

**incision** [ɪn'sɪʒn] *n* **1.** kəsmə, kəsilmə, doğrama, doğranma; **2.** kəsik, yarıq; *The doctor made an incision to take out the splinter Tilişkəni çıxartmaq üçün həkim kəsik açdı*

**incisive** [ɪn'saɪsɪv] *adj* **1.** kəsici, kəsən; iti; **an ~ mind** iti ağıl; **2.** kəskin; tikanlı, acı, toxunan, zəhərli; istehzalı; **~ style** kəskin/tikanlı üslub; **~ smile** istehzalı təbəssüm; **~ voice** kəskin/qulaqbatırıcı səs; **the ~ weapon of satire** satiranın iti silahı; **3.: ~ tooth** *anat.* kəsici / qabaq diş



**incisively** [ɪn'saɪsɪvlɪ] *adv* kəskin, kəskin bir tərzdə, istehza ilə, istehzalı bir tərzdə

**incisiveness** [ɪn'saɪsɪvnɪs] *n* kəskinlik, zəhərlilik, istehza, itilik

**incisor** [ɪn'saɪzə[r]] *n anat.* qabaq / kəsici diş *(ağızın önündə olan səkkiz dişdən hər biri)*

**incite** [ɪn'saɪt] *v* **(to, into) 1.** oyatmaq, oyandırmaq, doğurmaq; **2.** həyəcanlandırmaq, həyəcana gətirmək; qıcıqlandırmaq, təhrik etmək, həvəsə gətirmək; stimul yaratmaq, ruhlandırmaq; **to ~ *smb.* to action** bir kəsi hərəkətə təhrik etmək, həvəsləndirmək; **to ~ *smb.* to a heroic deed** bir kəsi qəhrəmanlığa ruhlandırmaq; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir şey etməyə təhrik etmək

**incitement** [ɪn'saɪtmənt] *n* **1.** stimullaşdırma, həvəsləndirmə, şirnikdirmə; təhrik, ruhlandırma; **to do *smth.* by *smb.'s* ~** bir işi bir kəsin təhriki ilə etmək; **2.** stimul; təkan, oyandıran, hərəkətə gətirən *(bir şey)*

**inciter** [ɪn'saɪtə[r]] *n* **1.** stimulyator *(bitkilərin böyüməsini və inkişafını artıran kimyəvi maddə)*; vadaredici, oyadıcı; **2.** təhrikçi, fitləyən, qızışdıran

**incivility** [ˌɪnsɪ'vɪlɪtɪ] *n* ədəbsizlik, nəzakətsizlik, tərbiyəsizlik, kobudluq; **to commit an ~** tərbiyəsizlik/ədəbsizlik etmək, nəzakətsizlik göstərmək

**inclemency** [ɪn'klemensɪ] *n* **1.** soyuqluq; sərtlik *(iqlim, ab-hava və s. haq.)*; **2.** sərtlik, üzügülməzlik, qaşqabaqlıq

**inclement** [ɪn'klemənt] *adj* **1.** soyuq, sərt *(ab-hava haq.)*; **~ weather** soyuq /sərt hava; *It's been rather inclement this week Bu həftə hava sərt/soyuq olub*; **2.** qəddar, sərt; **~ ruler** qəddar hökmdar

**inclinable** [ɪn'klaɪnəbl] *adj* meylli, həvəsli, meyl göstərən, meyli / həvəsi olan; **~ to fall** yıxılmağa meylli; **~ to mercy** mərhəmətə /şəfqətə meylli

**inclination** [ˌɪnklɪ'neɪʃn] *n* **1.** əymə, əyilmə; meyl, meyllilik; *I have neither the time nor the inclination to go to the cinema today Mənim bu gün kinoya getməyə nə vaxtım, nə də meylim var*; **an ~ of the head** baş əymə *(razılıq və s. işarəsi olaraq)*, **an ~ of the body** bədənin əyilməsi; **to have an ~ for music** musiqiyə meyli olmaq; **to feel a strong ~ to do *smth.*** bir şeyi etməyə güclü meyli/həvəsi olmaq; **an ~ to stoutness** kökəlməyə meyllilik; **to have an ~ to get fat/ stout** kökəlməyə meylli olmaq; *I have an inclanation to get fat/stout Mən kökəlməyə meylliyəm;* **2.** maili səth, eniş; əyilmə; **the ~ of a roof** damın mailliyi; **the ~ of a tower** qüllənin əyilmə mailliyi; **~ of the track** yolun əyilməsi / enişliyi

**incline** [ɪn'klaɪn] *v* **1.** əymək; **to ~ *one's* head** başını əymək; **to ~ *one's* body** bədənini əymək; **2.** əyilmək, meyl etmək; kənara çıxmaq; **to be ~d to drink** içkiyə meylli olmaq; **3.** razı etmək, inandırmaq, təsir altına salmaq, meyllləndirmək, təhrik etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir şey etməyə inandırmaq/təhrik etmək; **to be / to feel ~d to do *smth.*** bir şeyi etməyə meylli olmaq;
◊ **to ~ *one's* steps toward home** evə tərəf istiqamət almaq / yollanmaq; **to ~ *one's* ear to *smth.*** bir şeyə iltifatla qulaq vermək/asmaq

**inclined** [ɪn'klaɪnd] *adj* mail, yatıq; meylli, əyilmiş; **~ plane** mail müstəvi; **~ light** maili işıq; **a child ~ to mischief** dəcəlliyə meylli uşaq; *He's inclined to be lazy O tənbəlliyə meyllidir*; **to be ~ to do *smth.*** bir şeyi etməyə meylli olmaq; *Generally speaking, I'm inclined to agree with him Ümumiyyətlə danışsaq, mən onunla razılaşmaq fikrindəyəm*

**include** [ɪn'klu:d] *v* **1.** olmaq, daxil olmaq, daxilində/tərkibində olmaq, ehtiva etmək; *Does the price include tax Qiymətə vergi daxildirmi?; The conference delegates include many representatives from abroad Konfrans nümayəndələrinin tərkibində çoxlu xarici nümayəndələr var; We all left the meeting me/myself included Biz hamımız iclası tərk etdik, mən də daxil olmaqla; I included eggs on the list of things to buy Alınmalı şeylərin siyahısına mən yumurtanı əlavə/ daxil etdim*; **2.** özündə birləşdirmək, tərkibinə daxil olmaq; **to ~ *smb.* among *one's* friends** bir kəsi dostları sırasına daxil etmək

**including** [ɪn'klu:dɪŋ] *prep* ...da, ...də, daxil edərək/olmaqla; **6 people, ~ 3 women** 3 qadın da daxil olmaqla 6 adam; *We were six including our guest Qonağımız da daxil olmaqla biz altı nəfər idik*

**inclusion** [ɪn'klu:ʒən] *n* daxil etmə/edilmə, yerləşdirmə, yerləşdirilmə; qoşma, qoşulma

**inclusive[1]** [ɪn'klu:sɪv] *adj* ...da, ...də, daxil olan, özündə birləşdirən; **a party of ten ~ of the host** ev sahibi də daxil olmaqla on nəfərdən ibarət qrup; **~ payment/price/ terms** bütün xidmətləri əhatə/ehtiva edən qiymət *(mehmanxanada və s.)*

**inclusive[2]** [ɪn'klu:sɪv] *adv* daxil olmaqla; **from Monday till Saturday ~** şənbə də daxil olmaqla bazar ertəsindən şənbəyə qədər; **pages 7 to 25 ~** 7-ci səhifədən 26-cı səhifəyə kimi, 25-ci səhifə də daxil olmaqla

**inclusively** [ɪn'klu:sɪvlɪ] *adv* ...da/...də, daxil olmaqla /edilərək / olmaq şərtilə

**incognito[1]** [ɪn'kɔgnɪtou] *n* inkoqnito *(uydurma/ özgə adla yaşama)*; *His incognito endangered Onun uydurma/özgə ad altında yaşamasının açılması/aşkar olması təhlükəsi vardı*

**incognito[2]** [ɪn'kɔgnɪtou] *adj* özgə/ uydurma adla yaşayan, uydurma ad altında yaşayan

**incognito[3]** [ɪn'kɔgnɪtou] *adv* özgəsinin/başqası-

nın adı altında, uydurma ad altında, uydurma adla; **to live ~** uydurma adla/ad altında yaşamaq; **to travel ~** uydurma adla/ad altında səyahət etmək; *He didn't want to be recognized, so he travelled incognito O tanınmağını istəmirdi, ona görə də başqasının adı altında səyahət etdi*

**incoherence** [.ınkou'hıərəns] *n* rabitəsizlik, qarışıqlıq, dolaşıqlıq, məntiqsizlik, əlaqəsizlik *(nitqdə, fikirdə və s.)*; **~ of speech** nitqin rabitəsizliyi / əlaqəsizliyi / məntiqsizliyi

**incoherent** [.ınkou'hıərənt] *adj* **1.** rabitəsiz, əlaqəsiz, məntiqsiz, qarışıq, dolaşıq; **~ sentence** mənasız/rabitəsiz/əlaqəsiz cümlə; **~ ideas** əlaqəsiz/dolaşıq/məntiqsiz fikirlər; **the ~ words of a mad man** dəli adamın rabitəsiz / məntiqsiz sözləri; *He was quite incoherent O, tamamilə rabitəsiz/dolaşıq/əlaqəsiz danışırdı*; **2.** uyğun /düz gəlməyən, yaramayan, əl verməyən, əlverişli/münasib olmayan; **~ public** tərkibcə müxtəlif olan camaat / publika

**incoherently** [.ınkou'hıərəntlı] *adv* rabitəsiz, qarışıq; dolaşıq, məntiqsiz, əlaqəsiz, mənasız, addabudda; **to speak ~** rabitəsiz / əlaqəsiz danışmaq

**incombustible** [.ınkəm'bʌstəbl] *adj* **1.** yanmayan, alovlanmayan, odadavamlı; **an ~ substance** yanmayan/ odadavamlı maddə

**income** ['ınkəm] *n* gəlir, mədaxil *(xüs. müəyyən dövrdə, aylıq, illik və s.)*; qazanc, muzd, əmək haqqı; **net/pure ~** təmiz gəlir / qazanc; **gross ~** ümumi gəlir / qazanc *(xərci çıxılmamış gəlirin hamısı)*; **national ~** milli gəlir; **monthly ~** aylıq gəlir / qazanc; **to raise *one's* ~** gəlirini / qazancını artırmaq; **to have a good ~** yaxşı gəliri/qazancı olmaq; **to live beyond *one's* ~** öz gəliri/qazancı ilə yaşamamaq; **a person of small ~** azmaaşlı / az maaş alan adam

**income-tax** ['ınkəmtæks] *n* gəlir vergisi, gəlirdən tutulan vergi

**incoming**[1] ['ın.kʌmıŋ] *n* gəlmə, gəliş, gəlib çıxma, varid olma; **the ~ of a train** qatarın gəlməsi; **the ~ of spring** yazın gəlməsi / gəlişi

**incoming**[2] ['ın.kʌmıŋ] *adj* **1.** gələn, daxil olan; **~ passengers** mənzil başına çatan sərnişinlər; **2.** yeni seçilmiş/seçilən; **~ mayor** yeni seçilən mer *(bələdiyyə rəisi)*; **the ~ president** yeni seçilmiş/seçilən prezident; **3.** daxil olan *(gəlir və s. haq.)*; **~ payment** daxil olan ödəniş; **~ mail** daxil olan poçt; **4.** gələn, başlanan, çatmaqda / yaxınlaşmaqda olan, üzümüzə gələn; **the ~ year** yaxınlaşmaqda olan/üzümüzə gələn il

**incommensurability** ['ınkə.menʃərə'bılıtı] *n* ölçüyə gəlməmə, tutuşdurula/qarşılaşdırıla bilməmə, müqayisə edilməzlik, uyğunsuzluq

**incommensurable** [.ınkə'menʃərəbl] *adj* bir ölçüyə gəlməyən, tutuşdurula / qarşılaşdırıla bilməyən, vahid miqyasla ölçülə bilməyən; **~ things** bir ölçüyə gəlməyən şeylər

**incommensurate** [.ınkə'menʃərıt] *adj* **(to, with)** tənasübsüz, uyğunsuz, əndazəsiz, ölçüsü birbirinə uyğun / düz gəlməyən, müvafiq olmayan; **a salary ~ to *one's* position** tutduğu vəzifəsinə müvafiq olmayan/gəlməyən maaş/məvacib; *His means are incommensurate with his wants Onun imkanları tələblərinə müvafiq / uyğun deyil*

**incommode** [.ınkə'moud] *v* narahat etmək, incitmək, əziyyət / azar / sıxıntı vermək, sıxışdırmaq, təzyiq etmək; mane olmaq; **to be ~d by *smth.*** bir şeyə görə əziyyət / sıxıntı çəkmək; *Fog incommoded them greatly Duman onlara çox əziyyət verdi / mane oldu*

**incommodity** [.ınkə'mɔdıtı] *n* narahatlıq, əziyyət; nigarançılıq, təlaş, təşviş

**incommunicable** [.ınkə'mju:nıkəbl] *adj* **1.** dillə təsvir edilə bilməyən, sözlə deyilə bilməyən, ifadə oluna / edilə bilməyən; xəbər verilə bilməyən; **2.** rabitəsi/əlaqəsi olmayan, təcrid olunmuş

**incommunicado** ['ınkə.mju:nı'ka:dou] *adj hüq.* yazışma hüququndan məhrum edilmiş / olunmuş; **to hold *smb.* ~ 1)** bir kəsi yazışma hüququndan məhrum edərək həbsdə saxlamaq; **2)** biradamlıq kamerada saxlamaq

**incommunicative** [.ınkə'mju:nıkətıv] *adj* adamayovuşmaz, adamdanqaçan, ünsiyyətsiz, azdanışan, qaradinməz

**incomparability** [ın.kɔmpərə'bılıtı] *n* müqayisə edilməzlik, misilsizlik, çox gözəllik / qəşənglik

**incomparable** [ın'kɔmprəbl] *adj (to, with)* müqayisə edilməz, misilsiz, çox gözəl / qəşəng; **~ beauty** misilsiz gözəllik; **~ wealth** müqayisə edilməz var-dövlət

**incomparably** [ın'kɔmprəblı] *adv* müqayisə edilməz dərəcədə, misilsiz olaraq, çox gözəl / qəşəng

**incompatibility** [.ınkəmpætı'bılıtı] *n* bir araya sığmazlıq, bir araya sığışa bilməmə, uyuşmazlıq, ziddiyyət; uyğun gəlməmə, müvafiq olmama, uyğunsuzluq; **~ of temper** xarakterlərin/xasiyyətlərin uyğun gəlməməsi

**incompatible** [.ınkəm'pætəbl] *adj* bir araya sığışmaz, bir araya sığışa bilməyən, uyuşmaz, ziddiyyətli; **~ ideas** bir araya sığışmaz fikirlər / ideyalar; **~ colours** uyuşmaz rənglər; **persons of ~ temper** müxtəlif xarakterli / xasiyyətli / təbiətli adamlar; **~ with reason** sağlam ağıla sığmaz, sağlam ağıla zidd

**incompetence** [ın'kɔmpıtəns] *n* **1.** səlahiyyətsizlik, səriştəsizlik, təcrübəsizlik, məlumatsızlıq; qabiliyyətsizlik, bacarıqsızlıq; **the ~ of a conclusion** qərarın etibarsızlığı; **~ to do *smth.*** bir iş görmək üçün bacarığı olmama; **2.** *hüq.* hüququn olmaması, vətəndaşlıq hüququ olmama

**incompetent** [ın'kɔmpıtənt] *adj* **1.** səlahiyyətsiz, səriştəsiz, təcrübəsiz, məlumatsız, biliksiz; bacarıqsız, qabiliyyətsiz; **to be ~ to do *smth.*/for doing *smth.*** bir iş görməyə/işi etməyə səlahiyyəti/səriştəsi olmamaq; **~ administrator** təcrübəsiz / bacarıqsız administrator/müdir; **~ cook** təcrübəsiz/qabiliyyətsiz/bacarıqsız aşpaz; **~ leadership** bacarıqsız rəhbərlik; **2.** *hüq.* hüququ olmayan; **~ evidence** məhkəmənin qəbul etmədiyi sübut/dəlil; **~ witness in court** məhkəmədə şahid olma hüququ çatmayan şəxs



**incompetently** [ın'kɔmpıtəntlı] *adv* səriştəsiz bir tərzdə; bacarıqsız/qabiliyyətsiz bir surətdə

**incomplete** [.ınkəm'plı:t] *adj* **1.** natamam, yarımçıq; **an ~ set of books** kitabların natamam komplekti; **2.** qeyri-mükəmməl, natamam, nöqsanlı, kəsirli; **~ knowledge** natamam / kəsirli bilik

**incompletely** [.ınkəm'plı:tlı] *adv* yarımçıq, nöqsanla, yarımçıq / nöqsanlı bir tərzdə

**incompleteness** [.ınkəm'plı:tnıs] *n* natamamlıq, yarımçıqlıq, nöqsanlılıq

**incomprehensibility** [ın'kɔmprı.hensə'bılıtı] *n* anlaşılmazlıq, başa düşülməzlik; anlaşılmama, aydın olmama; dərkedilməzlik, ağılasığmazlıq

**incomprehensible** [ın.kɔmprı'hensəbl] *adj* anlaşılmayan, başa düşülməyən; anlaşılmaz, aydın olmayan; ağlaçatmaz, dərkedilməz, ağılasığmaz; **to be ~ to *smb.*** bir kəsə aydın olmamaq, bir kəs tərəfindən başa düşülməmək

**incomprehension** [ın.kɔmprı'henʃn] *n* anlaşılmama, başa düşməmə, dərk etməmə

**incomprehensive** [ın.kɔmprı'hensıv] *adj* **1.** anlaqsız, küt, gec başa düşən, fəhmsiz, fərasətsiz; **2.** məhdud, dardüşüncəli, darfikirli

**inconceivable** [.ınkən'sı:vəbl] *adj* **1.** anlaşılmayan, başa düşülməyən; anlaşılmaz, müəmmalı, dərkedilməz, ağılasığmaz; **2.** *d.d.* ağıla gəlməyən, inanılmaz, təsəvvür edilməz, xəyala gətirilə bilməyən, qeyri-adi

**inconclusive** [.ınkən'klu:sıv] *adj* **1.** sübut edilə bilməyən, inandırıcı olmayan, qane etməyən, əsassız, sübutsuz; qəti olmayan *(nəticə və s. haq.)*; **~ evidence** inandırıcı olmayan dəlil/sübut; **~ reasoning** inandırıcı olmayan dəlil; **2.** natamam, yarımçıq, tamamlanmamış

**incongruous** [ın'kɔŋgruəs] *adj* **1.** uyğun gəlməyən, müvafiq olmayan, ağıla batmayan; **~ colours** uyğun gəlməyən rənglər; **2.** mənasız, məntiqsiz; **~ story** mənasız/ məntiqsiz hekayə; **3.** yersiz, ədəbsiz, nalayiq; **~ manners** ədəbsiz/nalayiq xasiyyət

**inconsecutive** [.ınkən'sekjutıv] *adj* ardıcıl olmayan, məntiqsiz

**inconsequence** [ın'kɔnsıkwəns] *n* **1.** ardıcıl olmama, fikrinin üstündə axıra qədər durmama; **2.** məntiqsizlik

**inconsequent** [ın'kɔnsıkwənt] *adj* **1.** ardıcıl olmayan, fikrinin üstündə axıra qədər durmayan; **2.** məntiqsiz; **~ reasoning** ardıcıl olmayan mühakimə; **~ argument** məntiqsiz dəlil/sübut; **3.** yersiz, münasibətsiz; **~ remark** yersiz irad

**inconsequently** [ın'kɔnsıkwəntlı] *adv* ardıcıl olmayaraq; qeyri-məntiqi, məntiqsiz olaraq, məntiqsiz, məntiqsizcəsinə

**inconsiderable** [.ınkən'sıdərəbl] *adj* kiçik, balaca, cüzi; xırda; əhəmiyyətsiz; **~ distance** kiçik məsafə; **an ~ amount of money** kiçik məbləğdə pul; **~ stream** balaca /kiçik çay; **~ in number** miqdarca az/cüzi

**inconsiderate** [.ınkən'sıdərət] *adj* **1.** diqqətsiz, etinasız, saymaz, ehtiramsız, hörmətsiz; başqaları ilə hesablaşmayan; **~ person** başqalarına etinasız adam; **2.** lazımınca düşünülməmiş, fikirləşmədən edilən; diqqətsiz, laqeyd, tədbirsiz; **~ conduct** diqqətsiz/ehtiyatsız hərəkət/rəftar

**inconsideration** ['ınkən.sıdə'reıʃn] *n* **1.** diqqətsizlik, huşsuzluq; etinasızlıq, hörmətsizlik, laqeydlik; **2.** lazımınca düşünülməmə, ehtiyatsızlıq, laqeydlik, tədbirsizlik, başısoyuqluq

**inconsistency** [.ınkən'sıstənsı] *n* **1.** bir araya sığmazlıq, bir araya sığışa bilməmə, uyuşmazlıq, ziddiyyət; uyğun gəlməmə, müvafiq olmama, düz gəlməmə; **the ~ of one thing with another** bir şeyin digəri ilə uyğun gəlməməsi; **2.** ardıcıl olmama, məntiqsizlik, ziddiyyət; *The story is full of inconsistencies Hekayə ziddiyyətlərlə doludur*

**inconsistent** [.ınkən'sıstənt] *adj* **1.** bir araya sığışmaz, bir araya sığışa bilməyən, uyuşmaz, ziddiyyətli; uyğun/düz gəlməyən, müvafiq olmayan; ağıla batmayan; **~ statements** ziddiyyətli bəyanatlar; **actions ~ with *smb.'s* principles** bir kəsin prinsipinə uyğun gəlməyən/ olmayan hərəkətlər; **2.** dəyişkən, qeyri-sabit; **~ views** dəyişkən baxışlar/görüşlər/ fikirlər; **3.** ardıcıl olmayan; **~ conclusion** məntiqsiz nəticə; **to be ~ with *one's* own self** özü-özünə zidd olmaq

**inconsolable** [.ınkən'souləbl] *adj* təsəlli tapmayan, təsəllisiz, çarəsiz, ümidsiz, ovunmaz; **~ distress / sorrow** təsəllisiz dərd / kədər; **to be ~ for *one's* loss** itkisi üçün çox mütəəsir olmaq / çox həyacan keçirmək; *He was inconsolable when his wife died Arvadı ölərkən o çox mütəəssir oldu / kədərləndi*

**inconsolably** [.ınkən'souləblı] *adv* kədərli-kədərli, dərdli-dərdli, ümidsiz-ümidsiz; **to weep ~** dərdli-dərdli ağlamaq

**inconsonant** [ın'kɔnsənənt] *adj* **(with, to)** həmahəng / uyğun olmayan, düz / uyğun gəlməyən, ahəngsiz *(səs)*

**inconspicuous** [.ınkən'spıkjuəs] *adj* görünməyən, seçilməyən, hiss edilməyən, nəzərə çarpmayan; **small ~ flowers** seçilməyən / nəzərə çarpmayan çiçəklər; **to dress in ~ colours** solğun/nəzərə çarpmayan rəngli paltar geymək; **to make oneself as ~ as possible** bacardıqca özünü diqqətdən kənarda saxlamaq

**inconstansy** [ın'kɔnstənsı] *n* dəyişkənlik, səbatsızlıq; qərarsızlıq, dəmdəməkilik, vəfasızlıq, dönüklük

**inconstant** [ın'kɔnstnt] *adj* 1. dəyişkən, tezdəyişən, səbatsız; qərarsız, dəmdəməki; hərdəmxəyal, vəfasız, dönük; ~ **lover** vəfasız/dönük aşiq; 2. qeyri-müntəzəm, qeri-sabit, dəyişkən; ~ **flame** qeyri-müntəzəm alov; ~ **style** dəyişkən üslub

**inconstantly** [ın'kɔnstəntlı] *adv* dəyişkən / səbatsız bir surətdə / tərzdə

**incontestable** [.ınkən'testəbl] *adj* danılmaz, danışıqsız, şəksiz, şübhəsiz, aydın, aşkar; təkzibedilməz, rəddedilməz; ~ **evidence/ proof** təkzibedilməz/danılmaz sübut/dəlil; **an ~ fact** təkzibedilməz / danılmaz / şübhəsiz fakt

**incontinence** [ın'kɔntınəns] *n* 1. səbirsizlik, hövsələsizlik, təmkinsizlik; özünü saxlaya bilməmə/saxlamama *(xüs. cinsi əlaqədə)*; 2. *tib.* saxlaya bilməyən; ~ **of urine** sidik saxlaya bilməmə

**incontinent** [ın'kɔntınənt] *adj* 1. səbirsiz, hövsələsiz, təmkinsiz; 2. *tib.* saxlaya bilməmə *(sidiyi, nəcisi)*; *People often become incontinent when they get very old Adamlar çox qocalanda sidiyi / nəcisi saxlaya bilmirlər*

**incontrovertibility** [ın.kɔntrəvə:tə'bılıtı] *n* danılmazlıq, şəksizlik, şübhəsizlik, aydınlıq, aşkarlıq

**incontrovertible** ['ınkɔntrə'və:təbl] *adj* danılmaz, şəksiz, şübhəsiz, aydın, aşkar, təkzibedilməz, təkzib edilə bilməyən, rəddedilməz, inandırıcı; şübhəsiz; ~ **evidence** təkzibedilməz/danılmaz sübut/dəlil; ~ **fact** şübhəsiz/inandırıcı /danılmaz fakt

**incontrovertibly** [ın'kɔntrə'və:təblı] *adv* danılmaz bir surətdə, şəksiz olaraq, heç bir şübhə yeri olmadan, qəti şəkildə / olaraq

**inconvenience**[1] [.ınkən'vi:njəns] *n* narahatlıq; əziyyət; ~ **of a custom** adətin ağırlığı; **to suffer much ~, to experience extraordinary ~** həddən artıq narahatlıq keçirmək; **to cause ~ to** *smb.* bir kəs üçün narahatlıq yaratmaq; **to put oneself to great ~s** özü üçün böyük narahatlıq yaratmaq, özünü işə salmaq; *He apologized for the inconvenience he had caused Yaratdığı narahatlıq üçün o, üzr istədi*

**inconvenience**[2] [.ınkən'vi:njəns] *v* narahatlıq yaratmaq, narahat etmək, incitmək, əziyyət / azar vermək, təngə gətirmək, bezdirmək, bezar etmək; **to ~** ***smb.*** **by complaints** şikayətlə bir kəsi cana gətirmək / bezar etmək / bezdirmək

**inconvenient** [.ınkən'vi:njənt] *adj* narahat, rahatlığı olmayan, namünasib, münasib olmayan, naqolay; ~ **time** namünasib vaxt; ~ **staircase** narahat pilləkən; **to find** ***smth.*** ~ bir şeyi namünasib hesab etmək

**inconveniently** [.ınkən'vi:njəntlı] *adv* narahat, naqolay, narahat bir tərzdə

**inconvertible** [.ınkən'və:təbl] *adj mal.* sərbəst dəyişdirilə bilməyən, başqa ölkələrin valyutasına dəyişdirilə bilməyən; ~ **currency** sərbəst dəyişdirilə bilməyən valyuta *(bir ölkədə qəbul edilmiş sistem)*

**incorporate** [ın'kɔ:pəreıt] *v* 1. birləşdirmək; daxil / əlavə etmək; qatmaq; **to ~ a suggestion in a plan** təklifi plana daxil etmək; *The book incorporates the newest information Kitabda ən son məlumatlar vardır*; 2. birləşmək; **to ~ with others** başqaları ilə birləşmək; 3. qəbul etmək; üzvlər sırasına daxil etmək; **to ~** ***smb.*** bir kəsi üzvlüyə qəbul etmək *(kluba və s.)*; 4. qeydə almaq, hüquqi şəxs kimi qeydə almaq; **to ~ a firm** firmanın hüquqi statusunu rəsmiləşdirmək/qanuni şəklə salmaq; 5. qatmaq, qatışdırmaq; **to ~ fertilizers with soil** gübrəni torpağa qatmaq/ qarışdırmaq; 6. birləşmək, qarışmaq; *Truth and falsehood will not incorporate Həqiqətlə yalan uzlaşmaz*

**incorporated** [ın'kɔ:pəreıtıd] *adj* 1. hüquqi şəxs sifəti ilə qeydə alınmış; 2. birləşdirilmiş, ilhaq edilmiş

**incorporation** [ın.kɔ:pə'reıʃn] *n* 1. birləşmə, birlik, təşkilat, ittifaq; birləşdirmə; 2. korporasiya *(bir peşəyə və s. mənsub olan adamların ittifaqı/cəmiyyəti)*; 3. tərkibinə daxil olma; **the ~ of foreign words into the language** xarici / əcnəbi sözlərin dilə daxil olması

**incorporeal** [.ınkɔ:'pɔ:rıəl] *adj* cisimsiz, qeyri-maddi, qeyri-cismani, bədənsiz, mücərrəd

**incorrect** [.ınkə'rekt] *adj* 1. yanlış, düzgün / doğru olmayan, səhv, yalan; **an ~ answer** yanlış / yalan cavab; ~ **conclusions** səhv/ yanlış nəticələr; ~ **calculation** yanlış/ səhv / hesablama; 2. nəzakətsiz, ədəbsiz, tərbiyəsiz, kobud, ləyaqətsiz, nalayiq; ~ **conduct / behaviour** ədəbsiz / nalayiq / ləyaqətsiz davranış

**incorrectly** [.ınkə'rektlı] *adv* 1. yanlış olaraq, düzgün/doğru olmayaraq, səhv olaraq, səhvən; 2. ədəbsizcəsinə, həyasızcasına; **to answer ~** ədəbsizcəsinə/kobudcasına cavab vermək

**incorrectness** [.ınkə'rektnıs] *n* yanlışlıq, səhvlik; ~ **of the answer** cavabın yanlışlığı

**incorrigible** [ın'kɔrıdʒəbl] *adj* düzəldilməz, islaholunmaz, düzəldilə bilməyən; ümidsiz, çarəsiz; **an ~ liar/gambler** islaholunmaz yalançı / qumarbaz; ~ **habits** düzəldilməsi mümkün olmayan/tərkediləbilinməz adətlər; ~ **mistakes /errors** düzəldilməsi mümkün olmayan səhvlər

**incorrupt** [.ınkə'rʌpt] *adj* 1. pozulmamış, xarab olmamış, təmiz; dəyişdirilməmiş, əsl; həqiqi, orijinal; ~ **text** dəyişdirilməmiş/orijinal mətn; 2. düz, təmiz, vicdanlı, namuslu; ~ **judge** vicdanlı/namuslu hakim

**incorruptibility** [.ınkə.rʌptə'bılıtı] *n* 1. namusluluq, etibarlılıq, dəyanətlilik, sadiqlik; 2. xarab olmama, çürüməmə

**incorruptible** [.ınkə'rʌptəbl] *adj* 1. namuslu, etibarlı, dəyanətli, sadiq; ~ **judge** namuslu / dəyanətli hakim; *Judges should be incorruptible Hakimlər namuslu/dəyanətli olmalıdırlar*; 2. xarab olmayan, çürüməyən, paslanmayan, kimyəvi təsirə düşməyən



**increase**[1] ['ınkri:s] *n* artma, böyümə; inkişaf, inkişaf etmə, çoxalma; **gradual / steady/sudden ~** tədricən/arasıkəsilmədən/qəfil artım/inkişaf; ~ **of knowledge** biliyin artımı/inkişafı; ~ **of/in population** əhalinin artması/çoxalması; ~ **of weights** *id.* çəkinin artması; *The population showed an increase of 10 per cent Əhali 10 faiz artıb*

**increase**[2] [ın'kri:s] *v* 1. artırmaq; **to ~ the speed** sürəti artırmaq; **to ~** ***one's*** **income** gəlirini artırmaq; **to ~** ***one's*** **knowledge** biliyini artırmaq; **to ~** ***one's*** **pace** addımlarını tezləşdirmək; 2. artmaq, çoxalmaq; güclənmək; **to ~ in number / in quantity** sayca/miqdarca artmaq; **to ~ in size** böyümək, ölçücə artmaq; *The population has increased from 1.2 million 10 years ago to 1.8 million today On il müddətində əhali 1,2 milyondan 1,8 milyona qədər artıb*; 3. çoxalmaq, artmaq, törəyib artmaq; *Guinea-pigs increase rapidly Dəniz donuşları tez / sürətlə çoxalır; These flowers will increase every year Bu çiçəklər ildən-ilə artacaq*

**incredibility** [ın.kredı'bılıtı] *n* doğruya oxşamama, yalan, inanılmaz, həqiqətə uyğun olmama, ağıla sığmama

**incredible** [ın'kredıbl] *adj* 1. doğruya oxşamayan, yalan, inanılmaz, həqiqətə uyğun olmayan; ~ **stories** həqiqətə oxşamayan /inanılmaz hekayələr; 2. *d.d.* təəccüblü, qəribə, ağıla gəlməyən/sığmayan, görünməmiş, eşidilməmiş; ~ **speed** görünməmiş sürət; ~ **bravery** eşidilməmiş qəhrəmanlıq / cəsarət / qoçaqlıq; ~ **difficulties** görünməmiş/ağılasığmayan çətinliklər

**incredibly** [ın'kredəblı] *adv* inanılmayacaq dərəcədə, son dərəcə, fövqəladə bir tərzdə

**incredulity** [.ınkrı'dju:lıtı] *n* inamsızlıq, etibarsızlıq, etimadsızlıq, inanmama, etimad göstərməmə; skeptisizm; **to receive** ***smth.*** **with ~** bir şeyi inamsızlıqla qəbul etmək, bir şeyin həqiqiliyinə şübhə etmək

**incredulous** [ın'kredjuləs] *adj* heç kəsə inanmayan / etibar etməyən, hər şeydən şübhələnən; inamsızlıq ifadə edən; ~ **look** inamsızlıq ifadə edən baxış

**incredulously** [ın'kredjuləslı] *adv* şübhə ilə, etimadsızlıqla, inamsızlıqla, şəkk-şübhə ilə

**increment** ['ınkrımənt] *n* 1. artırma, artırılma, çoxaltma, çoxaldılma; artım; artma, böyümə; ~ **of temperature** temperaturun artması; 2. gəlir, artım, əlavə

**incriminate** [ın'krımıneıt] *v* 1. taqsırlandırmaq, müqəssir bilmək, ittiham etmək; günahkar bilmək; **to ~** ***smb.*** **his actions** hərəkətlərinə görə bir kəsi müqəssir/günahkar bilmək; 2. üstünü açmaq, aşkara çıxartmaq, ifşa etmək; *The evidence incriminates him İfadə onu ifşa edir*; **to ~ oneself** özünü ifşa etmək

**incriminating** [ın'krımıneıtıŋ] *adj* ittiham edən, taqsırlandırıcı, müqəssiredici, ifşa edən; ifşaedici; ~ **documents/letters** ifşaedici sənədlər/məktublar; ~ **evidence** ifşaedici / təqsirləndirici ifadə

**incriminatory** [ın'krımınətərı] *adj* ittihamedici, ittiham edən

**incrustation** [.ınkrʌs'teıʃn] *n həm də* **encrustation** 1. qabıq, qat, ərp; qabığın/ qatın/ərpin əmələ gəlməsi; 2. inkrustasiya, qaxma *(başqa bir materialın üzərinə qaxılan sədəf, sümük, qiymətli daş və s.-dən ibarət bəzək)*

**incubate** ['ınkjubeıt] *v* 1. inkubatorda cücə çıxartmaq; 2. yumurtanın üstündə kürt yatmaq; 3. çıxmaq *(cücə haq.)*; 4. *məc.* çoxdan fikrində tutmaq, fikri ilə yaşamaq, ətraflı düşünmək, fikirdə/beynində hazırlamaq, fikrində götür-qoy etmək; **to ~ a plot** sui-qəsdin planını götür-qoy etmək; *Plans for revolution had long been incubating in their minds İnqilab üçün plan onların beynində uzun müddət idi ki, hazırlanırdı*; 5. *biol.* yetişdirmək, becərmək *(bakteriyanı)*; **to ~ germs in a laboratory** bakteriyanı laboratoriyada əkmək/becərmək

**incubation** [.ınkju'beıʃn] *n* 1. inkubasiya, cücə çıxartma *(inkubatorda)*; 2. kürt yatma; 3. *tib.* inkubasiya *(xəstəliyin yoluxduğu vaxtdan ilk əlamətlərinin meydana çıxmasına qədər çəkən gizli dövr)*

**incubator** ['ınkjubeıtər] *n* 1. inkubator *(yumurtadan süni surətdə cücə çıxartmaq üçün aparat)*; 2. *tex.* termostat *(müxtəlif şeyləri sabit temperaturda saxlamaq üçün cihaz)*

**incubus** ['ıŋkjubəs] *n (pl* **incubuses** *və ya* **incubi)** 1. iblis, şeytan, cin; 2. qarabasma, vahimə, qorxulu yuxu, kabus; 3. ağır yük; **the ~ of his unpaid debts** onun ödənilməmiş borclarının ağır yükü

**inculcate** ['ınkʌlkeıt] *v* təlqin etmək; inandırmaq, beyninə yeritmək; hipnoz etmək; doldurmaq, yerləşdirmək; **to ~ ideas in** ***smb.'s*** **mind** ideyaları / fikirləri bir kəsin beyninə yeritmək; **to ~ real knowledge** əsl biliyi təlqin etmək; **to ~ the truth** həqiqəti təbliğ etmək / yaymaq

**incumbent** [ın'kʌmbənt] *adj* 1. uzanan, yatan, əyilən, əyilmiş, sallanmış; **the ~ clouds** sallanmış buludlar; 2. tapşırılmış, həvalə edilmiş, qoyulmuş *(vəzifə və s.)*; **work / a duty that is ~ on** ***smb.*** bir kəsə tapşırılmış / həvalə edilmiş iş/vəzifə; *It is incumbent on him Bu ona tapşırılıb/həvalə edilib; She felt it incumbent on her to answer the letter Hiss etdi ki, məktuba cavab vermək onun vəzifəsidir / borcudur*

**incur** [ın'kə:r] *v* səbəb olmaq, özünü düçar etmək, doğurmaq, düşmək, qalmaq; **to ~ danger** təhlükəyə düçar olmaq / məruz qalmaq, özünü təhlükəyə salmaq; **to ~ trouble** özünü əziyyətə /bəlaya salmaq; **to ~** ***smb.'s*** **displeasure / hatred** özünə qarşı bir kəsdə narazılıq/nifrət oyatmaq / doğurmaq; **to ~ losses** 1) itkiyə mə-

ruz qalmaq, ziyana düşmək; 2) *hərb.* itki vermək; **to ~ debts through *smb.*** bir kəsə görə borca düşmək; **to ~ a penalty** *id.* cərimə olunmaq / qazanmaq

**incurable[1]** [ɪn'kjuərəbl] *n* **1.** sağalmaz xəstəliyə tutulmuş / düçar olmuş adam; **a home for ~s** sağalmaz xəstəliyə tutulmuş adamlar üçün ev

**incurable[2]** [ɪn'kjuərəbl] *adj* **1.** sağalmaz, müalicəsiz, çarəsiz, ölacsız; **~ disease** sağalmaz xəstəlik; **~ invalid** ümidsiz/ çarəsiz xəstə; **2.** dərin kök salmış, düzəldilə bilməyən, ortadan qaldırıla bilməyən, dəfedilməz; **~ habits** dərin kök salmış vərdişlər; **~ evils** düzəldilə bilməyən pis işlər; **to be ~** sağalmaz olmaq

**incurably** [ɪn'kjuərəblɪ] *adv* ölacsız, müalicəsiz; **to be ~ ill** müalicəsiz/ sağalmaz xəstəliyə düçar olmaq / tutulmaq

**incurious** [ɪn'kjuərɪəs] *adj* **1.** heç nə ilə maraqlanmayan, heç nəyə maraq göstərməyən

**incursion** [ɪn'kɜ:ʃn] *n* **1.** soxulma, basıb girmə, basqın, hücum, yürüş, gözlənilməz/qəfil hücum; **to make ~s** hücum etmək/ soxulmaq; **to repel a sudden ~ of enemy troops** düşmən qoşunlarının qəfil hücumunu dəf etmək; **foreign ~s into the domestic market** xarici bazarın daxili bazara soxulması; **2.** bir kəsin şəxsi həyatına /asudə vaxtına və s. təcavüz etmə; *I resent these incursions into my private life Şəxsi həyatıma edilən bu təcavüzlər məni qeyzləndirir*; **3.** hücum *(dəniz haq.)*; **to protect the lowland from the ~s of the sea** ovalığı/düzənliyi dənizin hücumlarından qorumaq

**indebted** [ɪn'detɪd] *adj* borclu olan *(bir kəs qarşısında)*, borclu *(bir kəsə)*; **to be ~ to *smb.* for *smth.*** bir kəsə nəyə görə isə borcu olmaq; *I am deeply indebted to you for your advice Məsləhətinə/Məsləhətinizə görə sənə/sizə çox minnətdaram*

**indebtedness** [ɪn'detɪdnɪs] *n* borcluluq, borc; minnətdarlıq hissi

**indecency** [ɪn'di:snsɪ] *n* **1.** ədəbsizlik, həyasızlıq; **2.** ədəbsiz davranış / hərəkət, ədəbsiz danışıq

**indecent** [ɪn'di:snt] *adj* **1.** ədəbsiz, nalayiq, yaraşmaz, yaramaz, həyasız; **an ~ joke** ədəbsiz zarafat; **~ behaviour** ədəbsiz/nalayiq davranış; **~ books** ədəbsiz kitablar; **to use ~ language** ədəbsiz/həyasız/nalayiq danışmaq; *That short skirt of hers is positively indecent Onun o gödək yubkası tamamilə biabırçıdır*; **2.** *d.d.* uyğunsuz, uyğun olmayan/gəlməyən; ləyaqətsiz; yaraşmayan; **~ wages** uyğun gəlməyən əmək haqqı / maaş

**indecently** [ɪn'di:sntlɪ] *adv* ədəbsiz, ədəbsizcəsinə, həyasız, həyasızcasına; **to speak ~** hərzə danışmaq, söyüş söymək; **to dress ~** ədəbsiz geyinmək

**indeciduous** [,ɪndɪ'sɪdjuəs] *adj bot.* həmişəyaşıl

**indecision** [,ɪndɪ'sɪʒən] *n* qərarsızlıq, qətiyyətsizlik, inamsızlıq, tərəddüd

**indecisive** [,ɪndɪ'saɪsɪv] *adj* qəti olmayan, həlledici olmayan; **~ battle** həlledici olmayan döyüş; **~ answer** qəti olmayan cavab; **2.** qətiyyətsiz, mütərəddid, qərarsız; **~ answer** qətiyyətsiz cavab

**indecisively** [,ɪndɪ'saɪsɪvlɪ] *adv* qətiyyətsiz, qətiyyətsiz bir surətdə/tərzdə; **to speak ~** qətiyyətsiz danışmaq

**indecisiveness** [,ɪndɪ'saɪsɪvnɪs] *n* qərarsızlıq, qətiyyətsizlik, mütərəddidlik

**indeclinable[1]** [,ɪndɪ'klaɪnəbl] *n gram.* hallanmayan söz

**indeclinable[2]** [,ɪndɪ'klaɪnəbl] *adj gram.* hallanmayan; **~ words** hallanmayan sözlər

**indecorous** [ɪn'dekərəs] *adj* ədəbsiz, nəzakətsiz, tərbiyəsiz, kobud; **~ behaviour** ədəbsiz / tərbiyəsiz davranış /rəftar/hərəkət

**indecorously** [ɪn'dekərəslɪ] *adv* ədəbsiz, ədəbsizliklə, tərbiyəsiz, kobud, ədəbsiz / tərbiyəsiz / kobud bir tərzdə

**indecorousness** [ɪn'dekərəsnɪs] *n* ədəbsizlik, nəzakətsizlik, tərbiyəsizlik, kobudluq

**indecorum** [,ɪndɪ'kɔ:rəm] *n* ədəbsizlik, ədəbsiz hərəkət, nalayiq iş, nəzakətsizlik, tərbiyəsizlik, hörmətsizlik, kobudluq; **to commit an ~** ədəbsizlik / tərbiyəsizlik / nəzakətsizlik etmək

**indeed** [ɪn'di:d] *adv* **1.** həqiqətən, əslində; *You are right, indeed Sən / Siz əslində haqlısan/haqlısınız; I was indeed impressed Mən həqiqətən mütəəssir oldum*; **2.** *Mənanı qüvvətləndirmək üçün işlənir: I'm very glad indeed Mən həqiqətən çox şadam*;

◊ *A friend in need is a friend indeed at. söz. Yaxşı dost yaman gündə tanınar*

**indefatigable** [,ɪndɪ'fætɪgəbl] *adj* yorulmaz, usanmaz, yorulmaq/usanmaq bilməyən; **~ worker** yorulmaq bilməyən fəhlə

**indefeasible** [,ɪndɪ'fi:zəbl] *adj* ayrılmaz, alınmaz, alına bilməyən, alınması mümkün olmayan; **an ~ right to *smth.*** bir şeyə aid danılmaz hüquq; **~ law** sarsılmaz / pozulmaz qanun

**indefectible** [,ɪndɪ'fektəbl] *adj* xarab olmayan, korlanmayan

**indefensible** [,ɪndɪ'fensəbl] *adj* **1.** müdafiə üçün münasib olmayan *(yer və s. haq.)*; **2.** bəraət /haqq qazandırıla bilməyən; **~ rudeness** haqq qazandırıla bilməyən kobudluq/qabalıq; **~ behaviour** haqq qazandırıla bilməyən davranış; *Lying is indefensible Yalançılığa haqq qazandırmaq olmaz*; **3.** sübut oluna bilməyən; **~ hypothesis** sübut oluna/edilə bilməyən fərziyyə

**indefianble** [,ɪndɪ'faɪnəbl] *adj* təyin oluna bilməyən, tərifə / təsvirə gəlməyən; dəqiq izah olunmayan

**indefianbly** [,ɪndɪ'faɪnəblɪ] *adv* qeyri-müəyyən, qeyri-müəyyən bir tərzdə/surətdə

**indefinite** [ɪn'defɪnɪt] *adj* **1.** qeyri-müəyyən, aydın/aşkar olmayan, örtülü; anlaşılmaz; **~ answer** qeyri-müəyyən cavab; **~ plan** qeyri-müəyyən plan; **~ words** anlaşılmaz/tanış olmayan sözlər; **~ language** aydın olmayan dil; **~ pronouns** *qram.* qeyri-müəyyən əvəzliklər; *He gave me an indefinite answer O, mənə qeyri-müəyyən cavab verdi*; **2.** qeyri-məhdud, hüdudsuz, məhdud olmayan; **~ time** qeyri-məhdud zaman; **~ space** hüdudsuz/ qeyri-məhdud məkan; **~ period** qeyri-məhdud dövr



**indefinitely** [ɪn'defɪnɪtlɪ] *adv* **1.** qeyri-müəyyən, qeyri-müəyyən bir tərzdə; *The work will be continued indefinitely Məlum deyil, iş nə qədər davam edəcək; A decision has been postponed indefinitely Qərar qeyri-müəyyən bir vaxta təxirə salınıb*; **2.** hədsiz, hədsiz-hüdudsuz, sonsuz, nəhayətsiz, intəhasız

**indefiniteness** [ɪn'defɪnɪtnɪs] *n* **1.** qeyri-müəyyənlik, müəyyən olmama; qeyri-müəyyən vəziyyət; anlaşılmazlıq; **2.** qeyri-məhdudluq, hüdudsuzluq, hədsizlik, intəhasızlıq

**indelible** [ɪn'delɪbl] *adj* pozulmayan, silinməz; **~ disgrace** silinməz biabırçılıq; **~ pencil** kimyəvi karandaş; **2.** getməyən *(ləkə haq.)*; **~ stain** getməyən ləkə; **3.** unudulmaz, yaddançıxmaz, silinməz; **~ recollections / impressions** unudulmaz xatirələr/təəssüratlar; **to make an ~ impression on *smb.*** bir kəsdə unudulmaz təəssürat yaratmaq; *She made an indelible impression on me O məndə unudulmaz təəssürat yaratdı*

**indelicacy** [ɪn'delɪkəsɪ] *n* nəzakətsizlik, ədəbsizlik, kobudluq, yersiz hərəkət

**indelicate** [ɪn'delɪkɪt] *adj* kobud, ədəbsiz, nəzakətsiz; hörmət gözləməyən; **~ behaviour** kobud / ədəbsiz davranış; **~ remarks** ədəbsiz / kobud iradlar

**indemnification** [ɪn,demnɪfɪ'keɪʃn] *n* əvəz vermə, ödəmə, kompensasiya

**indemnify** [ɪn,demnɪfaɪ] *v (pt, pp* **-fied)** **1.** təhlükəsizləşdirmək, təhlükəsiz etmək, təhlükədən qorumaq, qorumaq, mühafizə etmək; **to ~ *smb.*/oneself against / from the loss of *smth.*** bir kəsi /özünü bir şeyi itirməkdən qorumaq; **2.** **(for)** kompensasiya/əvəz vermək, ödəmək *(itkini)*; mükafatlandırmaq, mükafat vermək; **to ~ *smb.* for all the damages suffered** bir kəsə dəymiş bütün ziyanı ödəmək; **to ~ *smb.* for all the expenses incurred** bir kəsə çəkdiyi bütün xərcin əvəzini vermək; *I undertook to indemnify them for expenses incurred on my behalf Onların mənim əvəzimə çəkdikləri xərcləri ödəməyi boynuma götürdüm*

**indemnity** [ɪn'demnɪtɪ] *n* **1.** zəmanət, təminat, qarantiya; itkiyə / ziyana təminat; **a bond of ~** təminat / qarantiya məktubu; **a contract of ~** təminat / qarantiya müqaviləsi; **2.** kompensasiya, ödəmə, əvəzini vermə; **an ~ for breach of a contract** müqaviləni pozma üçün kompensasiya; **3.** təzminat; **to pay a war ~** müharibə təzminatı vermək; *The victorious nations are demanding huge indemnities from their former enemies Qalib dövlətlər əvvəlki düşmənlərindən çox böyük həcmdə təzminat tələb edirlər*; **4.** cəzadan və ya maddi məsuliyyətdən azad etmə

**indemonstrable** [ɪn'demənstrəbl] *adj* sübut edilə bilməyən, sübutedilməz, isbatedilməz; sübut tələb etməyən, sübuta ehtiyacı olmayan, aydın, aşkar, aksiomatik; **~ truth** sübuta ehtiyacı olmayan həqiqət

**indent[1]** ['ɪndent] *n* **1.** oyuq, çuxur, girinti, qazıq; kəsik yer; diş *(mişarda, daraqda və s.)*; **2.** alınacaq mal üçün sifariş *(xaricdən alınan)*; order *(müəyyən əməliyyat aparmaq və ya bir şey almaq üçün yazılı sənəd)*; **3.** *poliqr.* abzas, boş/açıq yer, boşluq *(sətir və ya abzas başında)*

**indent[2]** [ɪn'dent] *v* I **1.** kəsik-kəsik / parça-parça /doğram-doğram / tikə-tikə / diş-diş etmək, diş açmaq; oymaq, taraşlamaq, qazımaq, həkk etmək; **2.** iki və daha çox surətdən ibarət sənəd tərtib etmək; **3.** order və ya tələbnamə yazmaq *(mal almaq üçün)*; **to ~ for goods** mal almaq üçün sifariş vermək; **to ~ for new equipment** yeni avadanlıq üçün sifariş vermək; **4.** şagird vermək; **to ~ a boy to a tailor** oğlanı dərziyə şagird vermək; **5.** *poliqr.* abzasdan / sətir başından yazmaq

**indent** ['ɪndent] *v* II **1.** iz buraxmaq/qoymaq; **2.** şəkil / rəsm həkk etmək; **to ~ a pattern in a metal surface** dəmirin üstünə şəkil/rəsm həkk etmək

**indentation** [,ɪnden'teɪʃn] *n* **1.** kəsmə, doğrama, kəsik-kəsik/doğram-doğram / tikə-tikə etmə; **2.** diş *(mişarda, daraqda və s.)*; oyuq, çuxur, girinti, qazıq; girinti-çıxıntı; *The coast is full of indentations Sahil girinti-çıxıntı ilə doludur*; **3.** batıqlıq, çökəklik, çala, çökək, çuxur, oyuq, batıq; iz, nişanə, yer; **4.** *poliqr.* abzas, sətirbaşı

**independence** [,ɪndɪ'pendəns] *n* müstəqillik, istiqlaliyyət, asılı olmama; **to win ~** müstəqillik / istiqlaliyyət qazanmaq; **to live a life of ~** müstəqil yaşamaq; **to safeguard ~** müstəqilliyi təmin etmək; **The War of Independence** müstəqillik müharibəsi *(Amerikada)*; **Independence Day** müstəqillik / istiqlaliyyət günü *(hər il iyulun 4-də ABŞ-da milli bayram; 4 iyul 1776-cı ildə Amerikanın Britaniya müstəmləkəsindən azad olaraq öz müstəqilliyini elan etdiyi gün)*

**independent[1]** [,ɪndɪ'pendənt] *n* heç bir partiyanın üzvü olmayan adam, müstəqil adam

**independent[2]** [,ɪndɪ'pendənt] *adj* **1.** müstəqil, asılı/tabe olmayan; sərbəst, suveren, muxtar; **~ state/country** müstəqil dövlət/ ölkə; **~ television/school** müstəqil televiziya/məktəb; **~ clause** *qram.* müstəqil cümlə; *Barbados was once a British colony, but now it's independent Barbados bir zaman Britaniyanın müstəmləkəsi*

*idi, lakin indi müstəqildir*; ~ **unit** müstəqil vahid; ~ **young woman** sərbəst/müstəqil gənc qadın/xanım; ~ **of others** başqalarından asılı olmayan; 2. müstəqil gəliri olan, təmin olunmuş; ~ **workman** fərdi sənətkar

**independently** [ˌɪndɪ'pendəntlɪ] *adv* asılı olmadan / olmayaraq; sərbəst, müstəqil; sərbəst /müstəqil olaraq; özbaşına, ayrı; **to work** ~ sərbəst/müstəqil işləmək; *I did this work independently Mən bu işi müstəqil gördüm*; **to live** ~ ayrı/müstəqil yaşamaq; *The couple have split up and are now living independently Bu ər-arvad ayrılıblar, indi ayrı yaşayırlar*

**in-depth** ['ɪndepθ] *adj* dərin; ətraflı; **an ~ analysis** dərin/ətraflı təhlil; **an ~ discussion** ətraflı/dərin müzakirə; **an ~ interview** ətraflı intervyu / müsahibə

**indescribable** [ˌɪndɪ'skraɪbəbl] *adj* tərifəgəlməz, vəsfəgəlməz, təsviredilə / oluna bilməyən; çox güclü / şiddətli / ağır; ~ **beauty** tərifəgəlməz gözəllik

**indescribably** [ˌɪndɪ'skraɪbəblɪ] *adv* təsviredilməz/vəsfedilməz dərəcədə; çox güclü/şiddətli tərzdə; **to be ~ beautiful** təsvirəgəlməz dərəcədə gözəl olmaq

**indestructibility** ['ɪndɪsˌtrʌktə'bɪlɪtɪ] *n* dağılmazlıq, yox olmama, itməmə; **the law of ~ of matter** materiyanın itməməsi qanunu

**indestructible** [ˌɪndɪs'trʌktəbl] *adj* dağılmayan, pozulmayan, möhkəm; ~ **friendship** möhkəm / pozulmayan dostluq

**indeterminable** [ˌɪndɪ'tɜ:mɪnəbl] *adj* təyin edilə bilməyən, müəyyən edilə bilməyən, müəyyən edilməz

**indeterminate** [ˌɪndɪ'tɜ:mɪnət] *adj* 1. qeyri-müəyyən, müəyyən/aydın olmayan, anlaşılmaz, qarışıq, tutqun; ~ **future** qeyri-müəyyən gələcək; ~ **colour** anlaşılmaz rəng; ~ **feelings** anlaşılmaz hisslər; ~ **ideas** qarışıq/anlaşılmaz fikirlər; 2. həlledilməmiş, qəti olmayan; ~ **sentence** müttəhimin davranışından asılı olaraq müvəqqəti müddətə verilmiş hökm

**index**[1] ['ɪndeks] *n (pl* **indexes**, *ikinci mənada* **indices**) 1. siyahı, cədvəl, göstərici; ~ **of cost of living** yaşama minimumunun göstəricisi; 2. *məc.* işarə, əlamət: *The face is an index of the mood Övqatı üzdən bilmək olar*; 3. indeks, əlifba göstəricisi; kataloq, ədəbiyyat siyahısı; 4. əqrəb *(cihazların üstündə)*

**index**[2] ['ɪndeks] *adj*: ~ **finger** şəhadət barmağı

**index**[3] ['ɪndeks] *v* 1. indeks/siyahı/göstərici vermək; *The book is not well indexed Kitaba yaxşı indeks/göstərici verilməyib; Library books are indexed by author and title Kitabxana kitabları müəllifə və mövzuya görə indeksləşdirilir*; 2. işarə/göstərici qoymaq; göstərmək, göstərici / indeks kimi işlənmək

**Indian**[1] ['ɪndjən] *n* 1. hindu *(Amerikanın əzəli yerli əhalisi olan tayfalara verilən ad)*; **the ~s** *top.i* hindular; 2. ömrünün sonuna qədər Hindistanda yaşamış avropalı

**Indian**[2] ['ɪndjən] *adj* hindu; ~ **tribes** hindu qəbilələri; **an ~ summer** payızın əvvəllərində isti günlər; ~ **corn** qarğıdalı; ~ **cane** bambuk; ~ **ink** tuş; ~ **shoe** mokasin *(Şimali Amerika hindularının maral dərisindən tikdikləri ayaqqabı)*

**indiarubber** [ˌɪndɪə'rʌbə'] *n* rezin *(yazı pozmaq üçün)*, pozan

**indicate** ['ɪndɪkeɪt] *v* 1. göstərmək; **to ~ the way** yol göstərmək; **to ~ the temperature** temperaturu göstərmək; *With a wave of his hand he indicated to me where I should sit O, əlini yelləyərək mənim harada oturmalı olduğumu göstərdi; The dotted lines indicate the new frontiers Nöqtəli xətlər yeni sərhədləri göstərir*; 2. bildirmək, ifadə etmək, göstərmək, əlamətini bildirmək; **to ~ rain / wind** yağış / külək əlaməti olmaq; *This indicates his intentions Bu onun niyyətlərini ifadə edir: The minister has indicated (that) he may resign next year Nazir bildirib ki, ola bilsin ki, o, gələn il istefa versin/istefaya çıxsın*; 3. işarə vermək *(nəqliyyat vasitələri hərəkəti zamanı); He indicated (that) he was turning right O, işarə verdi ki, sağa dönür*

**indication** [ˌɪndɪ'keɪʃn] *n* 1. əlamət, nişanə, simptom, işarə; göstərmə, göstərilmə; göstəriş; **an ~ of an approaching storm** yaxınlaşan tufanın əlaməti/nişanəsi; **an ~ of weariness** yorğunluğun əlaməti/nişanəsi; 2. göstərmə, hesablama *(cihaz haq.); The speedometer indication was 50 miles Spidometr 50 mil göstərirdi*

**indicative** [ɪn'dɪkətɪv] *adj* 1. göstərən, bildirən; **to be ~ of smth.** bir şeyin göstəricisi/əlaməti olmaq; *A headache is sometimes indicative of eye strain Baş ağrısı bəzən gözün gərginliyinin əlaməti olur*; 2. *qram.* **the ~ mood** felin xəbər şəkli

**indicator** ['ɪndɪkeɪtə'] *n* 1. göstərici, işarə; **outer** ~ xarici göstərici; 2. indikator *(buxar maşınlarının silindrində təzyiqi ölçən cihaz)*; əqrəb *(sferblat üzərində)*; 3. sayğac

**indict** [ɪn'daɪt] *v* 1. ittiham irəli sürmək; günahkar hesab etmək; *He was indicted on a charge of treason Onu vətənə xəyanətdə ittiham etdilər*; 2. *arx.* elan etmək, demək; *They indicted people they knew to be innocent Onlar tanıdıqları adamların günahsız olduqlarını elan etdilər*

**indictable** [ɪn'daɪtəbl] *adj hüq.* məhkəmədə baxılmalı / müzakirə edilməli olan; ~ **offender** cinayətkar, cani

**indictee** [ˌɪndaɪ'ti:] *n hüq.* müttəhim, müqəssir

**indiction** [ɪn'dɪkʃn] *n* elan etmə; ~ **of war** müharibə elan etmə

**indictment** [ɪn'daɪtment] *n hüq.* 1. ittiham hökmü / qərarı; 2. ittiham irəli sürmə; **to drop an ~ against** *smb.* bir kəsə qarşı ittihamı ləğv etmək



**indifference** [ɪn'dɪfrəns] *n* 1. etinasızlıq, laqeydlik, qeydsizlik; əhəmiyyət verməmə, soyuqluq, maraq göstərməmə; **to show / to display ~** etinasızlıq/laqeydlik göstərmək; **to treat** *smb. /smth.* **with** ~ bir kəsə/ şeyə laqeyd/etinasız yanaşmaq; **to regard** *smb./smth.* **with** ~ bir kəsə /şeyə qarşı etinasız/laqeyd olmaq; ~ **to/ towards suffering/art /music** əzaba / incəsənətə / musiqiyə qarşı etinasızlıq; 2. azlıq, cüzilik; əhəmiyyətsizlik; **a matter of ~** əhəmiyyətsiz / azəhəmiyyətli iş/şey

**indifferent** [ɪn'dɪfrənt] *adj* 1. etinasız, laqeyd; maraqsız; ~ **spectator** laqeyd / etinasız tamaşaçı; ~ **to public opinion** ictimai fikrə/rəyə laqeyd; **to be ~ to danger** təhlükəyə laqeyd / etinasız olmaq, təhlükədən qorxmamaq; **to be ~ to the suffering of others** başqalarının əzabına etinasız / laqeyd / biganə qalmaq; 2. adi, orta, miyanə, babat, orta dərəcəli / səviyyəli; ~ **book / play** orta səviyyəli kitab / pyes; 3. az əhəmiyyətli, əhəmiyyətsiz; *The time for starting is indifferent to me Nə vaxt yola düşməyimizin mənim üçün əhəmiyyəti yoxdur*; 4. *kim.* neytral; ~ **gas** neytral qaz *(nə turşu, nə qələvi ilə reaksiyaya girməyən)*

**indifferently** [ɪn'dɪfrəntlɪ] *adv* 1. etinasız, etinasızcasına, etinasızlıqla, laqeyd, laqeydcəsinə, laqeydliklə, etinasız/ laqeyd bir tərzdə; **to look** ~ laqeydcəsinə/ etinasızcasına baxmaq; **to speak** ~ etinasız / laqeyd bir tərzdə danışmaq; *He shrugged his shoulders indifferently O, çiyinlərini etinasızcasına dartdı/çəkdi*; 2. orta, babat; **to play but** ~ babat oynamaq; 3. *arx.* qərəzsiz olaraq, üzgörmədən, ədalətlə, insafla

**indigenous** [ɪn'dɪdʒɪnəs] *adj* 1. yerli; ~ **schools** yerli məktəblər; ~ **people** yerli əhali; **an ~ language** yerli dil; **an ~ culture** yerli mədəniyyət; *The kangaroo is indigenous to Australia Kenquru Avstraliya üçün yerli heyvandır*; 2. xas olan, təbii, anadan gəlmə, fitri; **emotions ~ to human beings** insana xas olan hisslər

**indigent** ['ɪndɪdʒənt] *adj* kasıb, yoxsul

**indigestible** [ˌɪndɪ'dʒestəbl] *adj* 1. çətin həzm edilən; 2. anlaşılmaz; çətin anlaşılan / başa düşülən; **an ~ book** anlaşılmaz / çətin başa düşülən kitab

**indigestion** [ˌɪndɪ'dʒestʃn] *n* həzm etməmə, mədə pozulması; dispepsiya *(mədə fəaliyyətinin pozulması)*; **to suffer from accute ~** kəskin mədə pozulmasından əziyyət çəkmək; *Onions give me indigestion Soğan mənim mədəmi pozur*

**indignant** [ɪn'dɪgnənt] *adj* hiddətlənmiş, hiddətli, qəzəblənmiş, qəzəbli, acıqlı; **an ~ look** hiddətli/ qəzəbli / acıqlı baxış; **an ~ response** acıqlı/hiddətli/qəzəbli cavab

**indignantly** [ɪn'dɪgnəntlɪ] *adv* acıqla, hiddətlə, qəzəblə; **to answer ~** acıqla / qəzəblə / hiddətlə cavab vermək

**indignation** [ˌɪndɪg'neɪʃn] *n* hiddət, qəzəb; **to be full of ~** bərk hiddətlənmək / qəzəblənmək; *His indignation knows no bound Onun qəzəbinin /hiddətinin həddi-hüdudu yoxdur*; **to contain *one's* ~** öz hiddətini/qəzəbini cilovlamaq; *I expressed my indignation at being unfairly dismissed Ədalətsiz olaraq işdən çıxarıldığıma görə mən öz hiddətimi bildirdim*

**indignity** [ɪn'dɪgnətɪ] *n* 1. etinasızlıq/saygısızlıq/laqeydlik göstərmə, saymama, xor baxma, etinasızlıq, saymazlıq, laqeydlik, saygısızlıq, hörmətsizlik; **to treat** *smb.* **with** ~ bir kəsə etinasızlıq / hörmətsizlik göstərmək; 2. təhqir, həqarət; təhqir etmə; **to subject** *smb.* **to indignities** bir kəsi təhqir etmək

**indigo** ['ɪndɪgou] *n* tünd göy rəng

**indirect** [ˌɪndɪ'rekt] *adj* 1. vasitəli; ~ **taxes** vasitəli vergilər *(istehlak şeylərindən alınan vergilər)*; ~ **speech** *qram.* vasitəli nitq; ~ **object** *qram.* vasitəli tamamlıq; 2. dolayı; ~ **evidence** dolayı sübut/dəlil; **an ~ cause/result** dolayı səbəb/nəticə; **an ~ route** dolama yol; 3. ikimənalı, qeyri-səmimi; **to give an ~ answer** qeyri-müəyyən/ikimənalı cavab vermək; 4. namussuz, şərəfsiz; ~ **conduct** namussuz davranış; ~ **dealings** şərəfsiz sövdələşmə/ sövdə

**indirectly** [ˌɪndɪ'rektlɪ] *adv* qeyri-səmimi, ikiüzlü; dolayısılə; **to be ~ responsible for** *smth.* bir şey üçün birbaşa məsuliyyət daşımamaq

**indiscernible** [ˌɪndɪ'sɜ:nəbl] *adj* 1. fərqlənməz, ayırd edilə bilməyən, bir-birindən seçilməyən; ~ **difference** ayırd edilə bilməyən fərq; 2. görünməz, görünməyən; ~ **ways** görünməyən yollar

**indiscipline** [ɪn'dɪsɪplɪn] *n* intizamsızlıq; **the growing ~ in schools** məktəblərdə artmaqda olan intizamsızlıq

**indiscreet** [ˌɪndɪ'skrɪ:t] *adj* 1. nəzakətsiz, ədəbsiz, utanmaz; özünü saxlaya bilməyən; açıq-saçıq; ~ **behaviour** açıq-saçıq hərəkət / davranış; ~ **love letters** açıq-saçıq məhəbbət məktubları; 2. ağılsız, düşüncəsiz, yüngül; ehtiyatsız

**indiscreetly** [ˌɪndɪ'skrɪ:tlɪ] *adv* 1. nəzakətsiz, nəzakətsizcəsinə, ədəbsiz, ədəbsizcəsinə, utanmadan; 2. ağılsız, ağılsızcasına, düşünmədən

**indiscretion** [ˌɪndɪs'kreʃn] *n* 1. nəzakətsizlik, utanmazlıq, həyasızlıq; ədəbsizlik, hörmətsizlik, tərbiyəsizlik; **to repent *one's* ~** nəzakətsizliyinə / ədəbsizliyinə görə təəssüf etmək /peşmançılıq çəkmək; 2. ağılsızlıq, düşüncəsizlik, yüngüllük, ağılsız/ düşüncəsiz hərəkət; **to commit an ~** düşüncəsiz hərəkət etmək; 3. ehtiyatsızlıq; **to suffer for *one's* ~** öz ehtiyatsızlığından əziyyət / əzab çəkmək

**indiscriminate** [ˌɪndɪs'krɪmɪnɪt] *adj* 1. heç bir şeyə fərq qoymayan, ağına-bozuna baxmayan; tələbkar olmayan, fərq qoymayan; əsassız; ~ **reader** heç bir şeyə fərq qoymayan / ağına-bozuna baxmayan oxucu; ~ **abuse** əsassız təhqir; ~ **forgive-**

ness bütün günahlardan keçmə; **to give ~ praise to new books** yeni kitabları fərq qoymadan tərifləmək; **to deal ~ blows** hara gəldi zərbə endirmək; **to be ~ in *one's* choice of friend** dost seçməkdə ağına-bozuna baxmamaq/fərq qoymamaq; 2. qarışıq, qaydasız, nizamsız; **an ~ heap of clothing** qarışıq bir yığın paltar

**indiscriminately** [ˌɪndɪsˈkrɪmɪnɪtlɪ] *adv* 1. heç bir şeyə fərq qoymadan, ağına-bozuna baxmadan; əsassız olaraq; **to abuse ~** əsassız olaraq təhqir etmək; **to shoot ~ into the crowd** ağına-bozuna baxmadan camaata atəş açmaq; 2. nizamsız, səliqəsiz, nizamsız / səliqəsiz bir tərzdə, səliqəsiz / nizamsız olaraq

**indiscriminateness** [ˌɪndɪsˈkrɪmɪnɪtnɪs] *n* 1. heç bir şeyə fərq qoymama, ağına-bozuna baxmama; tələbkar olmama; 2. nizamsızlıq, qarışıqlıq, dolaşıqlıq

**indiscrimination** [ˈɪndɪs.krɪmɪˈneɪʃn] *n* 1. fərqləndirə bilməmə, tanıya bilməmə; 2. dolaşıqlıq, qarışıqlıq; fərq qoymama; **to show ~ in the choice of friends** dost seçməkdə ağına-bozuna baxmama

**indispensable** [ˌɪndɪsˈpensəbl] *adj* 1. **(to, for)** gərəkli, lazımlı; labüd, zəruri, vacib; **~ clothing** lazımlı geyim / paltar; **~ knowledge** vacib / zəruri bilik; **~ to life** yaşayış üçün lazım/vacib/zəruri olan; 2. əvəzolunmaz *(adam haq.)*; **~ person** əvəzolunmaz adam; **to consider oneself ~** özünü əvəzolunmaz hesab etmək

**indispose** [ˌɪndɪsˈpouz] *v* 1. meylsizlik oyatmaq, həvəsdən salmaq, soyutmaq *(bir işdən)*; *Hot weather indisposes one to work hard İsti hava ciddi işləməyə meylsizlik yaradır*; 2. qarşı qoymaq, fikir yaratmaq, əhval-ruhiyyə oyatmaq; **to ~ one person towards another** bir adamı digər adama qarşı qoymaq; 3. yararsız etmək/ hala salmaq; *Lack of sleep indisposes a person for the day Az yatmaq adamı bütün günü işə yararsız edir*

**indisposed** [ˌɪndɪsˈpouzd] *adj* 1. kefsiz, süst, əzgin, nasaz; naxoş; *She has a head-ache and is rather indisposed Onun başı ağrıyır və özünü kefsiz / nasaz hiss edir*; **to be ~ with a cold** soyuqlamaq və özünü kefsiz hiss etmək; 2. meyli / könlü / xoşu / rəğbəti olmayan, könlü olmayan; **to be ~ to take part in *smth.*** bir şeydə iştirak etməyə meyli / könlü olmamaq; **to feel ~ for a discussion** müzakirədə iştirak etməyə xoşu/könlü olmamaq; **~ to agree** razılaşmağa meyli/könlü olmayan

**indisposition** [ˌɪndɪspəˈzɪʃn] *n* 1. kefsizlik, süstlük, əzginlik, nasazlıq; naxoşluq; **to suffer from ~** nasazlıqdan / əzginlikdən əziyyət çəkmək; 2. **(to, towards)** meylsizlik, istəməmə, xoşlamama, xoşu gəlməmə, ürəyi yatmama; **an ~ to the interests of others** başqalarının maraqları ilə hesablaşmaq istəməmə

**indisputable** [ˌɪndɪsˈpju:təbl] *adj* danılmaz, şəksiz, şübhəsiz, aydın, aşkar; **~ facts** danılmaz/şəksiz/şübhəsiz faktlar; **~ rights** danılmaz hüquqlar; **~ privileges** aşkar / şəksiz imtiyazlar; **a poet of ~ genius** dahiliyi şübhə doğurmayan şair

**indisputably** [ˌɪndɪsˈpju:təblɪ] *adv* şəksiz, danılmaz bir surətdə, qəti şəkildə / olaraq, heç bir şübhəyə yer qoymadan

**indissoluble** [ˌɪndɪˈsɔljubl] *adj* 1. dağılmayan, çürüməyən, pozulmaz, pozulmayan, möhkəm, sarsılmaz; **~ ties of friendship** dostluğun möhkəm bağları; **~ wall** möhkəm/dağılmayan divar; **~ league** sarsılmaz/ möhkəm ittifaq; 2. *kim.* əriməyən, həll olunmayan

**indissolubly** [ˌɪndɪˈsɔljəblɪ] *adv* möhkəm /sarsılmaz bir tərzdə; **~ linked** möhkəm bir tərzdə bağlanmış

**indistinct** [ˌɪndɪsˈtɪŋkt] *adj* 1. aydın/aşkar olmayan, anlaşılmaz; **~ sound** aydın olmayan/anlaşılmaz səs; **~ speech** anlaşılmaz nitq; **~ view** qeyri-dəqiq fikir; 2. dumanlı, tutqun, yayğın, qeyri-müəyyən; **~ idea/notion** dumanlı fikir /anlayış; **~ recollections / memories** dumanlı xatirələr

**indistinction** [ˌɪndɪsˈtɪŋkʃn] *n* fərqin olmaması, fərqsizlik; **~ of parts** hissələr arasında fərqsizlik

**indistinctly** [ˌɪndɪsˈtɪŋktlɪ] *adv* aydın olmayaraq, dolaşıq / qarışıq bir tərzdə, anlaşılmaz bir surətdə, qeyri-müəyyən bir surətdə; inanılmayacaq dərəcədə

**indistinguishable** [ˌɪndɪsˈtɪŋgwɪʃəbl] *adj* ayırd edilə bilməyən, bir-birindən seçilməyən, seçilməyən, görünməyən, hiss edilməyən, nəzərə çarpmayan; **~ difference** seçilməyən / hiss edilməyən fərq; **~ shades** bir-birindən seçilməyən çalarlar; **~ likeness** güclə fərqlənən oxşarlıq; **~ copies** tam eyni surətlər

**individual**[1] [ˌɪndɪˈvɪdʒuəl] *n* şəxsiyyət, adam; **agreeable ~** xoşxasiyyət / üzüyola adam; **a talented ~** istedadlı adam; **the rights of the ~** şəxsiyyətin hüquqları

**individual**[2] [ˌɪndɪˈvɪdʒuəl] *adj* 1. şəxsi, fərdi; **~ taste** şəxsi zövq; **~ peculiarities** fərdi xüsusiyyətlər; **~ property** şəxsi mülkiyyət; 2. ayrı, tək, ayrı-ayrı; xüsusi; şəxsi; **~ question** ayrı sual; **~ man** xüsusi adam; **~ case** xüsusi hadisə; **each ~ person/ word** hər bir ayrı adam/söz; 3. səciyyəvi; **an ~ style of writing/speaking** səciyyəvi yazı/danışıq tərzi

**individualism** [ˌɪndɪˈvɪdʒuəlɪzm] *n fəls.* fərdiyyətçilik *(tarixi və ictimai hadisələri xalqların, kütlələrin, siniflərin fəaliyyətinin nəticəsi deyil, fərdlərin fəaliyyətinin nəticəsi hesab edən idealist görüş)*

**individualist** [ˌɪndɪˈvɪdʒuəlɪst] *n* fərdiyyətçi; *She's a complete individualist in her art O, sənətində tam fərdiyyətçidir*

**individuality** [ˌɪndɪ.vɪdʒuˈælɪtɪ] *n* fərdiyyət, şəxsiyyət; **a man of marked ~** qeyri-adi şəxsiyyət; *He has no individuality Onun əsla şəxsiyyəti yoxdur*; **to lose *one's* ~** şəxsiyyətini itirmək; **to retain *one's* ~** şəxsiyyətini mühafizə etmək / saxlamaq



**individualisation** [ˌɪndɪ.vɪdʒuəlaɪˈzeɪʃn] *n* = **individualization**

**individualization** [ˌɪndɪ.vɪdjʒəlaɪˈzeɪʃn] *n* fərdiləşmə, fərdiləşdirmə, fərdi əlamətlərinə görə ayırma / təyin etmə

**individualise** [ˌɪndɪˈvɪdʒuəlaɪz] *v* = **individualize**

**individualize** [ˌɪndɪˈvɪdʒuəlaɪz] *v* fərdiləşdirmək, fərdiləşmək, fərdi əlamətlərə görə ayırmaq/ayrılmaq; *His style individualizes his work Üslubu onun işini fərdiləşdirir*

**individually** [ˌɪndɪˈvɪdjuəlɪ] *adv* fərdi olaraq, xüsusi surətdə, təkbaşına, tək; **to help *smb.* ~** bir kəsə şəxsən / təkbaşına kömək etmək; **to do some work ~** bir işi təkbaşına / tək görmək

**indivisibility** [ˌɪndɪ.vɪzɪˈbɪlɪtɪ] *n* bölünməzlik, bütövlük, ayrılmazlıq

**indivisible** [ˌɪndɪˈvɪzəbl] *adj* bölünməz; ayrılmaz; *For her, work and leisure were indivisible Onun üçün iş və istirahət ayrılmaz idi*

**Indo-European** [ˌɪndou.juərəˈpɪ:ən] *adj* Hind-Avropa; **~ languages** Hind-Avropa dilləri; **~ culture** Hind-Avropa mədəniyyəti; **~ linguistics** Hind-Avropa dilçiliyi

**indolence** [ˈɪndələns] *n* avaralıq, veyillik, ölüvaylıq, kəsalət; **to waste *one's* time in ~** vaxtını boş-boşuna keçirmək

**indolent** [ˈɪndələnt] *adj* boş, tənbəl, avara, veyil; **~ pupil** tənbəl/avara şagird; **good-natured ~ man** yumşaqürəkli tənbəl adam

**indomitable** [ɪnˈdɔmɪtəbl] *adj* tabe/ram olmayan, ram edilməz, yola gəlməyən, ipə yatmayan; azğın; **~ temper** azğın xarakter

**indoor** [ˈɪndɔ:ʳ] *adj* otaq, ev, bina; **~ work** binada görülən iş; **~ occupation** ev işləri; **~ games** binada/idman zalında keçirilən oyunlar; **~ swimming-pool** örtülü üzgüçülük hovuzu

**indoors** [ˈɪnˈdɔ:z] *adv* evdə, otaqda, binada; **to stay ~** evdə oturmaq, evdən çıxmamaq

**indubitable** [ɪnˈdju:bɪtəbl] *adj* şübhəsiz, yəqin, şəksiz, labüd, mütləq; **~ facts** şübhəsiz/şəksiz faktlar; **~ right** danılmaz hüquq; **~ news** həqiqi/doğru xəbər; **~ truth** şübhəsiz / şəksiz həqiqət

**indubitably** [ɪnˈdju:bɪtəblɪ] *adv* şübhəsiz, şübhəsiz / şəksiz olaraq

**induce** [ɪnˈdju:s] *v* 1. vadar/məcbur/ təhrik etmək, həvəs oyatmaq; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir iş görməyə vadar/təhrik etmək; *I was induced to come against my will İstəyimin əksinə olaraq məni gəlməyə məcbur etdilər*; 2. səbəb / bais olmaq, nəticələnmək, törətmək, doğurmaq; **to ~ fatigue** yorğunluğa səbəb olmaq, yorğunluq doğurmaq; **to ~ doubt** şübhə yaratmaq/doğurmaq; **drugs which ~ sleep** yuxugətirən dərmanlar/ vasitələr

**induced** [ɪnˈdju:st] *adj* məcburi, icbari, çarəsiz; **an ~ labour** məcburi əmək

**inducement** [ɪnˈdju:smənt] *n* 1. səbəb, arzu, niyyət, meyl, stimul; **to be an ~ to do *smth.*** bir işi görmək üçün səbəb / stimul olmaq; 2. *hüq.* giriş hissə *(sənəddə və s.)*

**induct** [ɪnˈdʌkt] *v* 1. rəsmi olaraq vəzifəyə gətirmək/qoymaq; **to ~ a new rector** yeni rektor qoymaq; 2. **(into)** qəbul etmək; **to be ~ed into army** orduya qəbul olunmaq

**induction** [ɪnˈdʌkʃn] *n* 1.*mənt.* induksiya *(xüsusi mülahizələrdən ümumi nəticə çıxarmaq üsulu)*; **logical ~** məntiqi nəticə; 2. induktiv metod, induksiyaya əsaslanan metod; 3. rəsmi olaraq vəzifəyə qoyma/ təyin etmə; 4. *amer.* hərbi xidmətə çağırma

**inductive** [ɪnˈdʌktɪv] *adj mənt.* 1. induktiv; **~ logic** induktiv məntiq; **~ method** induktiv metod; **~ evidence** induktiv metod vasitəsilə sübut etmə; 2. giriş; 3. mühüm, əsas, baş

**indulge** [ɪnˈdʌldʒ] *v* 1. mərhəmətli /iltifatlı olmaq *(bir kəsə qarşı)*; imkan vermək, göz yummaq, yol vermək *(pis işə)*, görməməzliyə vurmaq; **to ~ *smb.'s* passions** bir kəsin ehtirasına göz yummaq; **to ~ *smb.'s* desire** bir kəsin arzusuna mane olmamaq; **to ~ a sick person** xəstənin şıltaqlığını yerinə yetirmək; **to ~ *one's* children** 1) hər şeydə uşaqlarına güzəştə getmək; 2) uşaqlarını korlamaq / ərköyün böyütmək; *You can't indulge every creature Sən/Siz hamını razı sala bilməzsən/bilməzsiniz*; 2. *(adət.* **in)** kef vermək *(özünə)*, kef etmək, özünə rəva bilmək / görmək; **to ~ in swimming/in cycling** üzgüçülüyə / velosiped idmanına maraq göstərmək; **to ~ in noisy games** səs-küylü oyunlara həvəs göstərmək; *He seldom indulges in a holiday O, nadir hallarda özünə istirahət verir*; 3. **(with)** kef vermək, əyləndirmək; *He indulged the company with a song O, qonaqları mahnı oxumaqla əyləndirdi*; **to ~ oneself with a cigar** məmnuniyyətlə siqar çəkmək; 4. *d.d.* çox / bərk içmək; *d.d.* vurmaq; *I'm afraid he indulges too much Onun çox / bərk içməyindən qorxuram*; *Let's indulge ourselves with a bottle of champagne Gəl / Gəlin bir butulka şampan vuraq*

**indulgence** [ɪnˈdʌldʒəns] *n* 1. mərhəmət, iltifat; yumşaqlıq, rəhmdillik; dözüm, səbr; **to hope for ~** mərhəmətə ümid etmək; **to treat *smb.* with ~** bir kəsə mərhəmət / rəhmdillik göstərmək; *There is no limit to his indulgence for his grand-children Onun nəvələrinə olan mərhəmətinin hədd-hüdudu yoxdur*; 2. yol/imkan vermə, görməməzliyə vurma, mane olmama, üz vermə; **to reproach *smb.* for his ~** üz verdiyinə görə bir kəsi tənbeh etmək; 3. imtiyaz, üstünlük

**indulgent** [ɪnˈdʌldʒənt] *adj* 1. mərhəmətli, iltifatlı, yumşaq; **~ parents** mərhəmətli/ iltifatlı valideynlər; **an ~ smile** iltifatlı təbəssüm; 2. dözülə

bilən, dözümlü, yumşaq; ~ **criticism** dözülə bilən/yumşaq tənqid

**industrial** [ɪn'dʌstrɪəl] *adj* **1.** sənaye; ~ **goods** sənaye malları; ~ **country** sənaye ölkəsi; ~ **exhibition** sənaye sərgisi; ~ **area** sənaye rayonu; **the ~ revolution** sənaye inqilabı; **the world's leading ~ nations** dünyanın sənayecə aparıcı dövlətləri; **the country's ~ and commercial base** ölkənin sənaye və ticarət bazası; **2.** texniki; ~ **alcohol** texniki spirt; ~ **diamonds** texniki almaz; **3.** istehsalat; peşə; ~ **training** istehsalat təlimi; ~ **hygiene** istehsalat gigiyenası; ~ **disease** peşə xəstəliyi; ~ **school** peşə məktəbi; ~ **accident** istehsalat travması

**industrialism** [ɪn'dʌstrɪəlɪzm] *n* sənayeçilik *(sənayenin inkişafını iqtisadi siyasətin əsas məsələsi hesab edən cərəyan)*

**industrialist** [ɪn'dʌstrɪəlɪst] *n* sənaye/müəssisə sahibi, kapitalist, fabrik sahibi, fabrikçi

**industrialisation** [ɪn.dʌstrɪəlaɪ'zeɪʃn] *n* = **industrialization**

**industrialization** [ɪn.dʌstrɪəlaɪ'zeɪʃn] *n* sənayeləşdirmə, sənayeləşmə, sənayeləşdirilmə

**industrialise** [ɪn'dʌstrɪəlaɪz] *v* = **industrialize**

**industrialize** [ɪn'dʌstrɪəlaɪz] *v* sənayeləşdirmək; sənayeləşdirilmək; **Africa's need to ~** Afrikanın sənayeləşdirilməyə olan ehtiyacı

**industrially** [ɪn'dʌstrɪəlɪ] *adv* sənayecə, sənaye baxımından; **the ~ developed world** sənayecə inkişaf etmiş dünya; **the ~ developed countries** sənayecə inkişaf etmiş ölkələr

**industrious** [ɪn'dʌstrɪəs] *adj* işlək, çalışqan, əməksevər, zəhmətsevər; ~ **people** əməksevər/zəhmətsevər/çalışqan insanlar

**industriously** [ɪn'dʌstrɪəslɪ] *adv* səylə, ciddi-cəhdlə, çalışqanlıqla, əməksevərliklə

**industry** ['ɪndəstrɪ] *n* **1.** sənaye; **the car/ chemical/steel/nuclear ~** maşın / kimya / polad /nüvə sənayesi; **to privatize ~** sənayeni özəlləşdirmək; **to get a job in ~** sənayedə iş tapmaq; **a branch of ~** sənayenin bir sahəsi; **product of ~** sənaye məmulatı; **centre of ~** sənaye mərkəzi; **home ~** ölkədaxili sənaye; **2)** kustar /primitiv sənaye; **large-scale ~** iri sənaye; **2.** əməksevərlik, zəhmətsevərlik; səy, cidd-cəhd, çalışqanlıq, çalışma; **to praise** *smb.* **for his ~** bir kəsi əməksevərliyinə / çalışqanlığına görə tərifləmək

**inedible** [ɪn'edɪbl] *adj* yeyilməyən, yeyilmək üçün yaramayan; ~ **fat** yeyilmək üçün yaramayan / texniki piy; *The fish was almost inedible Balıq demək olar ki, yeyiləsi deyildi*

**ineffable** [ɪn'efəbl] *adj* sözlə deyilə bilməyən, dillə ifadə edilə bilməyən, son dərəcə böyük; təsvirəgəlməz; ~ **joy** təsvirəgəlməz sevinc/fərəh; ~ **anguish** dillə ifadə edilə bilməyən əzab / əziyyət

**ineffably** [ɪn'efəblɪ] *adv* son/olmazın dərəcədə, dillə ifadə edilməyəcək bir surətdə, təsviredilməz/təsvirəgəlməz bir tərzdə

**ineffective** [.ɪnɪ'fektɪv] *adj* **1.** nəticəsiz, nahaq, əbəs, bihudə, faydasız, lüzumsuz, əsassız; ~ **effort** faydasız /nəticəsiz cəhd; ~ **remedies** təsirsiz/faydasız vasitə; **2.** bacarıqsız, qabiliyyətsiz; ~ **workman** bacarıqsız işçi; *An ineffective person should not be chairman Bacarıqsız adam sədr olmamalıdır*

**ineffectively** [.ɪnɪ'fektɪvlɪ] *adv* nəticəsiz, boş / nahaq / əbəs yerə; bihudə, hədər, əbəs, faydasız, səmərəsiz

**ineffectiveness** [.ɪnɪ'fektɪvnɪs] *n* nəticəsizlik, faydasızlıq, mənasızlıq, səmərəsizlik, bihudəlik

**ineffectual** [.ɪnɪ'fektʃuəl] *adj* **1.** nəticəsiz, məqsədə çatmayan / nail olmayan; faydasız; ~ **effort** faydasız cəhd; ~ **attack** faydasız/nəticəsiz hücum; ~ **election** nəticəsiz / məqsədinə çatmayan seçki; *All his efforts were ineffectual Onun bütün səyləri faydasız oldu/heç bir nəticə vermədi*; **2.** bacarıqsız, qabiliyyətsiz; ~ **teacher / leader** bacarıqsız müəllim / rəhbər

**ineffeciency** [.ɪnɪ'fɪʃənsɪ] *n* **1.** qabiliyyətsizlik, bacarıqsızlıq, iqtidarsızlıq, acizlik; **2.** təsirsizlik, təsiri olmama

**ineffecient** [.ɪnɪ'fɪʃnt] *adj* **1.** qabiliyyətsiz, bacarıqsız, aciz; ~ **workman** bacarıqsız / qabiliyyətsiz işçi; ~ **administration** bacarıqsız müdiriyyət; **2.** təsirsiz, təsiri olmayan; ~ **measures** təsirsiz tədbirlər; **3.** az məhsuldar/səmərəli, az məhsul verən; ~ **labour** az məhsuldar /az məhsul verən əmək

**inelegant** [ɪn'elɪgənt] *adj* **1.** zərif/incə/gözəl olmayan; ~ **manner** zərif olmayan əda/xasiyyət; **2.** ağır, çətin başa düşülən; ~ **style** ağır üslub

**ineligible** [ɪn'elɪdʒəbl] *adj* **1.** heç bir vəzifəyə yaramayan / seçilə bilməyən; **to be ~ for the Presidency** prezident vəzifəsinə yaramayan; **2.** arzu edilməyən, arzuedilməz, bekar, yaramayan *(nişanlı qız/oğlan və s. haq.)*; ~ **son-in-law** kürəkən olmağa yaramayan; **3.** yararsız, yaramayan, yaramaz; ~ **for military service** hərbi xidmətə yaramayan

**ineluctable** [.ɪnɪ'lʌktəbl] *adj* labüd, qaçılmaz, zəruri; qabağıalınmaz; ~ **fate** qaçılmaz tale; ~ **logic** qaçılmaz /labüd məntiq

**inept** [ɪ'nept] *adj* **1.** yaramayan, əlverməyən, əlverişli / münasib olmayan; yersiz; ~ **words** yaramayan / yersiz sözlər; ~ **criticism** yersiz tənqid; **2.** bacarıqsız, qabiliyyətsiz, aciz; *I've never seen anyone so inept at making speeches Mən heç vaxt nitq söyləməkdə bu qədər qabiliyyətsiz bir kəs görməmişəm*; **3.** boş, mənasız, cəfəngiyyat, axmaq, sarsaq, gic, ağılsız; ~ **remark** axmaq / mənasız mülahizə; ~ **interference** mənasız müdaxilə

**ineptitude** [ɪ'neptɪtju:d] *n* **1.** yersizlik, münasibətsizlik; uyğunsuzluq; uyğun gəlməmə, müvafiq olmama; **2.** bacarıqsızlıq, qabiliyyətsizlik; ~ **for** *smth.***/ to do** *smth.* bir işi görməyi bacarmama; **3.** yersiz hərəkət, boş / yersiz fikir



**inequality** [.ɪnɪ'kwɔlɪtɪ] *n* **1.** bərabərsizlik, bərabər olmama; fərq; uyğun gəlməmə, müvafiq olmama, uyğunsuzluq *(keyfiyyətdə, ölçüdə və s.)*; **to fight against political/ racial ~** siyasi /irqi bərabərsizliyə qarşı mübarizə aparmaq; **the ~ in number** sayca bərabər olmama; **inequalities in human character** insani xüsusiyyətlərdə fərqlər; **to treat people with ~** insanlara müxtəlif cür münasibət bəsləmək/yanaşmaq; **the ~ of persons in respect to age** yaşa görə insanlar arasında fərq; **2.** əyri-üyrülük, kələ-kötürlük; **the inequalities of / in a surface** səthin kələ-kötürlüyü; **3.** dəyişkənlik *(iqlim və s. haq)*; **4.** qeyri-müntəzəmlik, bir qaydada olmama *(nəbzin vurması və s. haq)*; **the inequalities of the pulse** *tib.* nəbzin qeyri-müntəzəm vurması, aritmiya *(ürəyin normal fəaliyyətinin pozulması)*; **5.** qabiliyyətsizlik, bacarıqsızlıq

**inequitable** [ɪn'ekwɪtəbl] *adj* ədalətsiz, insafsız; tərəfgir, üzgörən, qərəzkar, qərəzli

**inequitably** [ɪn'ekwɪtəblɪ] *adv* ədalətsizliklə, insafsızlıqla, qərəzkarlıqla

**inequity** [ɪn'ekwɪtɪ] *n* ədalətsizlik, insafsızlıq; qərəzkarlıq, üzgörənlik

**ineradicable** [.ɪnɪ'rædɪkəbl] *adj* dərin kök salmış, ortadan qaldırıla bilməyən; ~ **habit** dərin kök salmış adət; ~ **hatred** dərin kök salmış nifrət; ~ **conflict** dərin konflikt / ixtilaf / münaqişə; ~ **prejudices** dərin kök salmış mövhumatlar

**inert** [ɪ'nə:t] *adj* **1.** cansız, hərəkətsiz; ~ **matter** cansız materiya; **2.** tənbəl, süst, fəaliyyətsiz *(insan haq.)*; **3.** *kim.* təsirsiz, təsir etməyən; ~ **gases** təsirsiz qazlar

**inertia** [ɪ'nə:ʃə] *n* **1.** *fiz.* inersiya *(xarici təsir olmadan, hərəkətdə olan cismin öz müvazinət hərəkətini, sükunətdə olan cismin isə öz sükunətini saxlama xassəsi)*; **to overcome the ~** inersiyanın qarşısını almaq, inersiyaya üstün gəlmək; **2.** süstlük, fəaliyyətsizlik, tənbəllik, ətalət; **to fall into ~** süstləşmək, tənbəlləşmək, fəaliyyətsizləşmək; **a feeling of ~ on a hot summer day** isti yay günündə süstlük hissi

**inescapable** [.ɪnɪ'skeɪpəbl] *adj* labüd, qaçılmaz, zəruri, qabağı alınmaz; ~ **fate** qaçılmaz tale; **an ~ conclusion** labüd nəticə; **an ~ fact** qaçılmaz fakt

**inessential** ['ɪnɪ'senʃl] *adj* əhəmiyyətsiz, əhəmiyyəti az olan, ikinci dərəcəli; **to cut down on ~ spendings** ikinci dərəcəli xərcləri azaltmaq

**inestimable** [ɪn'estɪməbl] *adj* qiymətləndirilə bilməyən, qiymətə gəlməyən; qiymətsiz *(yəni çox böyük qiyməti olan)*; ~ **wealth** qiymətləndirilməsi mümkün olmayan var-dövlət; ~ **monument** qiymətsiz abidə

**inestimably** [ɪn'estɪməblɪ] *adv* qiymətsiz dərəcədə, qiymətə gəlməyəcək surətdə / dərəcədə

**inevitability** [ɪn.evɪtə'bɪlɪtɪ] *n* labüdlük, zərurilik, qaçılmazlıq

**inevitable** [ɪn'evɪtəbl] *adj* **1.** labüd, qaçılmaz, zəruri, mütləq olacaq; ~ **conflict** labüd münaqişə/konflikt; **the ~ consequences of the war** müharibənin labüd / qaçılmaz nəticələri; **2.** *d.d.* dəyişməz, daimi; **a tourist with his ~ camera** daimi fotoaparatlı turist

**inevitableness** [ɪn'evɪtəblnɪs] *n* = **inevitability**

**inevitably** [ɪn'evɪtəblɪ] *adv* labüdən, mütləq, istər-istəməz; *The fall in demand for cars will inevitably mean some workers losing their jobs Maşınlara tələbin aşağı düşməsi bəzi fəhlələrin işlərini mütləq itirməsi deməkdir*

**inexact** [.ɪnɪg'zækt] *adj* səhv, yanlış, düz / dürüst/dəqiq olmayan; səliqəsiz, diqqətsiz, başdansovma, başdansovdu; ~ **translation** yanlış /diqqətsiz/başdansovma tərcümə; **an ~ comparison** yanlış müqayisə

**inexactly** [.ɪnɪg'zæktlɪ] *adv* düz / dürüst / düzgün olmayaraq, yanlış

**inexactness** [.ɪnɪg'zæktnɪs] *n* dürüst / düz / düzgün olmama, yanlışlıq

**inexcusable** [.ɪnɪks'kju:zəbl] *adj* bağışlanılmaz; yolverilməz; ~ **rudeness** bağışlanılmaz kobudluq / qabalıq; ~ **negligence** bağışlanılmaz səliqəsizlik / diqqətsizlik; ~ **deed** yolverilməz hərəkət / əməl

**inexcusably** [.ɪnɪks'kju:zəblɪ] *adv* yol verilməz / bağışlanılmaz bir tərzdə

**inexecutable** [.ɪnɪg'zekjutəbl] *adj* icrası mümkün olmayan, yerinə yetirilə bilməyən, həyatakeçirilməz, icraedilməz

**inexecution** [ɪn.eksɪ'kju:ʃn] *n* yerinə yetirməmə/yetirilməmə; ~ **of orders** göstərişlərin/sərəncamların yerinə yetirilməməsi

**inexhaustible** [.ɪnɪg'zɔ:stəbl] *adj* **1.** bitməz, tükənməz, bitməz-tükənməz, qurtarmayan; ~ **energy** tükənməz/tükənməz-bitməz enerji; *She seems to have inexhaustible energy Elə görünür ki, onun bitməz-tükənməz enerjisi var*; **2.** yorulmaz, yorulmaq bilməyən; ~ **toiler** yorulmaz/ yorulmaq bilməyən zəhmətkeş/əməkçi

**inexhaustibly** [.ɪnɪg'zɔ:stəblɪ] *adv* yorulmadan, yorulmaq bilmədən

**inexorable** [ɪn'eksərəbl] *adj* **1.** insafsız, amansız, rəhmsiz, zalım, qəddar, daşürəkli, mürvətsiz; ~ **destiny/fate** amansız tale; **2.** pozulmaz, möhkəm; qəti; ~ **logic** möhkəm məntiq

**inexorably** [ɪn'eksərəblɪ] *adv* insafsızcasına, rəhmsizcəsinə, amansızcasına

**inexpensive** [.ɪnɪk'spensɪv] *adj* ucuz, münasib qiymətli; **a relatively ~ meal** nisbətən ucuz yemək; *Window locks are inexpensive Pəncərə qıfılları ucuzdur*

**inexpensively** [.ɪnɪk'spensɪvlɪ] *adv* ucuz, ucuz qiymətə; **to buy** *smth.* ~ bir şeyi ucuz / ucuz qiymətə almaq

**inexperience** [.ɪnɪk'spɪərɪəns] *n* təcrübəsizlik, naşılıq; **the ~ of youth** gəncliyin təcrübəsizliyi;

*The blunder was a sign of inexperience Kobud səhv təcrübəsizliyin əlaməti idi*

**inexperienced** [ˌɪnɪk'spɪərɪənst] *adj* təcrübəsiz, naşı; **to be ~ in** *smth.* bir şeydə təcrübəsiz/naşı olmaq; **~ drivers** təcrübəsiz / naşı sürücülər

**inexpert** [ɪn'ekspə:t] *adj* bacarıqsız, qabiliyyətsiz, təcrübəsiz, məharətsiz

**inexpertly** [ɪn'ekspə:tlɪ] *adv* bacarıqsızlıqla, qabiliyyətsiz bir tərzdə

**inexplicable** [ˌɪnɪk'splɪkəbl] *adj* izahedilməz, izah edilə bilməyən; anlaşılmayan, anlaşılmaz, müəmmalı; **~ mystery** anlaşılmaz/müəmmalı sirr; **~ reason** anlaşılmaz/müəmmalı səbəb; *For some inexplicable reason, he gave up his job Bəzi müəmmalı / anlaşılmaz səbəbə görə o, işdən çıxdı*

**inexplicably** [ˌɪnɪk'splɪkəblɪ] *adv* anlaşılmaz / müəmmalı bir tərzdə

**inexplicit** [ˌɪnɪk'splɪsɪt] *adj* anlaşılmayan, başa düşülməyən, anlaşılmaz, aydın / aşkar olmayan; qeyri-müəyyən, örtülü

**inexplicitly** [ˌɪnɪk'splɪsɪtlɪ] *adv* anlaşılmaz bir tərzdə, aydın olmayaraq, qeyri-müəyyən bir tərzdə / surətdə

**inexpressible** [ˌɪnɪks'presəbl] *adj* sözlə deyilə bilməyən, dillə ifadə edilə bilməyən, təsvirəgəlməz, təsviredilməz, tərifəgəlməz, fövqəladə; **~ joy** sözlə deyilə bilməyən/dillə ifadə edilə bilməyən sevinc; **~ hardships** təsviredilməz çətinliklər

**inexpressive** [ˌɪnɪks'presɪv] *adj* ifadəsiz, ifadə baxımından/cəhətindən zəif; **~ eyes** ifadəsiz gözlər

**inextinguishable** [ˌɪnɪks'tɪŋgwɪʃəbl] *adj* sönməyən; sönməz, əbədi; yorulmaz, usanmaz, yorulmaq bilməyən; **~ rage** sönməz qəzəb /qeyz; **~ hopes** sönməz / əbədi ümidlər; **~ desire** əbədi arzu

**inextricable** [ˌɪn'ekstrɪkəbl] *adj* **1.** dolaşıq, qarışıq, dolaşdırılmış, dolaşıq salınmış; mürəkkəb; **~ knot** dolaşıq salınmış / dolaşdırılmış düyün; **2.** həlledilməz, həll edilə bilməyən, çarəsiz, çıxılmaz, əlacsız, ümidsiz; **~ difficulties** həlledilməz çətinliklər; **~ confusion** ağılagəlməz qarışıqlıq/dolaşıqlıq; **3.** ayrılmaz; *Economic difficulty and political dissatisfaction are inextricable İqtisadi çətinlik və siyasi narazılıq ayrılmazdır / bir-biri ilə bağlıdır*

**inextricably** [ˌɪn'ekstrɪkəblɪ] *adv* ayrılmaz; ayrılmaz surətdə; *Our foreign policy is inextricably bound up/linked with that of the USA Bizim xarici siyasətimiz ABŞ-ın xarici siyasəti ilə ayrılmaz surətdə bağlıdır*

**infallibility** [ɪnˌfælɪ'bɪlɪtɪ] *n* **1.** yanılmazlıq, qüsursuzluq; səhvsizlik; **2.** sazlıq, etibarlılıq, möhkəmlik

**infallible** [ɪn'fæləbl] *adj* **1.** qüsursuz, səhvsiz; düzgün; **~ result** düzgün nəticə; **to think oneself ~** özünü qusursuz hesab etmək; *None of us is infallible Bizlərin heç biri qüsursuz deyil; Unfortunately this book is not infallible Əfsus ki, bü kitab qüsursuz deyil*; **2.** dayanmadan /müntəzəm işləyən, saz; etibarlı, möhkəm; **~ machine** saz / möhkəm / etibarlı maşın; **~ proof** etibarlı dəlil / sübut; **an ~ test** etibarlı test

**infamous** ['ɪnfəməs] *adj* **1.** şərəfsiz, bədnam, hörmətsiz; **a name ~ in the history of England** İngiltərənin tarixində şərəfsiz bir ad; **2.** biabırçı, alçaq, rüsvayçı; gülünc; utanmalı, utanılacaq; **~ acts** biabırçı /gülünc hərəkətlər; **~ behaviour** eyibli/ rüsvayçı/ biabırçı davranış; **~ treachery** biabırçı/alçaq satqınlıq; **3.** *d.d.* pis, yaramaz, iyrənc; **~ pen** pis qələm; **~ dinner** iyrənc nahar

**infamy** ['ɪnfəmɪ] *n* **1.** biabırçılıq, rüsvayçılıq, şərəfsizlik; **to hold** *smb.* **in/up to ~** bir kəsi biabır / rüsvay etmək; **2.** alçaqlıq, əclaflıq, rəzalət; **to stand out as regards his ~** alçaqlığı/rəzilliyi/əclaflığı ilə fərqlənmək / seçilmək

**infancy** ['ɪnfənsɪ] *n* **1.** körpəlik/uşaqlıq dövrü, erkən uşaqlıq illəri; **natural ~** *hüq.* yeddi yaşa qədər uşaqlıq illəri; **in / *one's* early ~** erkən uşaqlıq illərində; **to die in ~** erkən uşaqlıq dövründə ölmək; **from ~ to old age** uşaqlıqdan qocalığa qədər/kimi; **a happy ~** xoşbəxt uşaqlıq; **2.** inkişafın erkən dövrü/başlanğıcı, yaranma dövrü; başlanğıc; **in the ~ of man/of mankind** bəşəriyyətin ilkin çağlarında; **in the ~ of arts and science** incəsənətin və elmin inkişafının erkən dövründə; **the ~ of a nation** millətin yaranması/təşəkkül tapması; *Our new plan is still only in its infancy Bizim yeni planımız hələ başlanğıc dövründədir*

**infant**[1] ['ɪnfənt] *n* **1.** uşaq, körpə, çağa, tifil *(yeddi yaşa qədər); He came to London 50 years ago as an infant O, 50 il bundan qabaq Londona gələndə uşaq idi*; **2.** dörd-yeddi yaş arasında olan uşaq *(ingilis təhsil sistemində)*; **an ~ school** 5-7 yaşlı uşaqlar üçün məktəb; **~ teachers** 5-7 yaşlı uşaqlar oxuyan məktəbdə dərs deyən müəllimlər; **3.** *hüq.* həddibuluğa çatmamış *(uşaq)*

**infant**[2] ['ɪnfənt] *adj* **1.** uşaq; **~ voice** uşaq səsi; **~ food** uşaq yeməyi; **~ feeding** südəmər uşağı yedirtmə; **~ care 1)** körpəyə xidmət; **2)** körpələrin mühafizəsi; **~ prodigy** vunderkind *(fövqəladə istedada malik olan uşaq); Mozart was a real prodigy Motsart əsl vunderkind idi*; **2.** baş, başlanğıc; ilk, sadə, yaranan; **~ industry 1)** yaranan sənaye; **2)** *amer.* sənayenin imtiyazlara malik olan yeni sahəsi

**infanticide** [ɪn'fæntɪsaɪd] *n* **1.** uşaq qatili / öldürən; **2.** *xüs.* yeni doğulmuş uşaqları öldürmə

**infantile** ['ɪnfəntaɪl] *adj* **1.** uşaq; **~ diseases /sicknesses** uşaq xəstəlikləri; **~ paralysis** uşaq iflici, poliomiyelit *(yoluxucu uşaq iflici)*; **~ literature** uşaq ədəbiyyatı; **~ pastimes** uşaq əyləncələri /oyunları; **2.** inkişafının başlanğıc mərhələsində olan



**infantilism** [ɪn'fæntɪlɪzəm] *n* **1.** infantilizm *(orqanizmin fiziki və psixi cəhətdən inkişafca geri qalması; uşaqlıq dövrünə xas olan xüsusiyyətlərin yaşlı adamlarda qalması)*; **2.** = **infantility**

**infantility** [ˌɪnfən'tɪlɪtɪ] *n* uşaqlıq, uşaq hərəkəti; yetişməmə

**infantry**[1] ['ɪnfəntrɪ] *n* piyada qoşun; **mounted ~** motorlaşdırılmış piyada qoşun

**infantry**[2] ['ɪnfəntrɪ] *adj* piyada qoşun; **~ platoon/regiment** piyada qoşun vzvodu/ alayı

**infantryman** ['ɪnfəntrɪmən] *n (pl* **-men** [-men]) piyada əsgər, piyadaçı

**infant-school** ['ɪnfəntsku:l] *n* məktəbəqədər uşaq müəssisəsi, uşaq bağçası, körpələr evi

**infarct** [ɪn'fa:kt] *n tib.* infarkt *(qan gəlməməsi nəticəsində bədənin hər hansı bir üzvünün toxumasının ölgünləşməsi)*

**infatuate** [ɪn'fætʃueɪt] *v* başını gicəltmək, dəli etmək, son dərəcə maraqlandırmaq, bərk cəzb/cəlb etmək, valeh/məftun etmək; **to ~ the public** publikanı / auditoriyanı valeh etmək; **to be ~d with** *smth.* bir şeylə son dərəcə maraqlanmaq; *He was infatuated with pride İftixardan onun başı gicəlmişdi, İftixar onun gözünü yummuşdu*

**infatuated** [ɪn'fætʃueɪtɪd] *adj* ağlını / başını itirmiş; kor olmuş *(ehtirasdan və s.)*; dəlicəsinə vurulmuş; *She's clearly infatuated with the boy Qız açıq-aydın oğlana dəlicəsinə vurulub*

**infatuation** [ɪnˌfætʃu'eɪʃn] *n* **1.** ehtiraslı maraq / həvəs / meyl; **2.** ehtiras, dəlicəsinə sevmə; **to fall into a deep ~ for** *smb.* bir kəsi dəlicəsinə/ehtirasla sevmək; *It's not a love; it's only a passing infatuation Bu məhəbbət deyil, keçib gedəcək ötəri ehtirasdır*

**infect** [ɪn'fekt] *v* **1.** yoluxdurmaq; infeksiya salmaq; **to be ~ed with diphtheria** difteritdən yoluxmaq; **to ~ a wound** yaraya infeksiya salmaq; **2.** sirayət etmək; *His laughter infected the whole class Onun gülüşü bütün sinfə sirayət etdi*

**infected** [ɪn'fektɪd] *adj* yoluxmuş, sirayət etmiş, keçmiş, infeksiya düşmüş/keçmiş; infeksiyalı; **an ~ wound** infeksiya keçmiş /düşmüş yara; **~ chickens** infeksiyalı cücələr

**infection** [ɪn'fekʃn] *n* **1.** yoluxma, infeksiya *(yoluxucu xəstəlik törədən orqanizm)*; **to spread by ~** infeksiya yolu ilə yayılmaq; *Help your body to resist infection Bədənini/Bədəninizi infeksiyaya davamlı olmağa öyrət/öyrədin; The infection may be carried through air İnfeksiya hava vasitəsilə keçirilə bilər*; **to be susceptible to ~** infeksiyaya qarşı həssas olmaq *(yəni yoluxucu xəstəliyə asanlıqla tutulmaq)*; **to catch / to get / to take an ~ from** *smb.* bir kəsdən yoluxmaq; **2.** yoluxuculuq, sirayətedicilik, keçicilik; **the ~ of an evil example** pis nümunənin yoluxuculuğu / sirayət ediciliyi

**infectious** [ɪn'fekʃəs] *adj* **1.** yoluxucu, keçici; **~ disease** yoluxucu xəstəlik; **~ hospital** yoluxucu xəstəliklər xəstəxanası; *Flu is infectious Qrip yoluxucudur*; **2.** sirayətedici; **an ~ laugh** sirayətedici gülüş; *Panic is infectious Təlaş sirayətedicidir*

**infer** [ɪn'fə:'] *v* **1.** nəticə çıxartmaq, nəticəyə gəlmək; izah etmək; **to ~ on slight evidence** kifayət qədər əsas olmadan nəticə çıxartmaq; *From what do you infer that? Sən/Siz nəyə əsaslanırsan?/əsaslanırsınız?*; **2.** göstərmək, bildirmək, ifadə etmək; təxmin/güman/fərz/ehtimal/zənn etmək, fikrində tutmaq; *Your silence infers consent Susmağın/Susmağınız göstərir ki, sən/siz razısan /razısınız*

**inference** ['ɪnfərəns] *n* nəticə; əqli nəticə; **unfounded ~s** əsassız nəticələr; **fair ~** ədalətli nəticə; **to draw an ~ from** *smth.* bir şeydən nəticə çıxartmaq; **2.** güman, fərziyyə, güman edilən şey; *That is a mere inference Bu sadəcə olaraq gümandır/fərziyyədir*

**inferior**[1] [ɪn'fɪərɪə'] *n* tabelikdə / tabe olan adam; aşağı səviyyəli adam; *He's my inferior O, məndən aşağıdır (inkişafda, ağılda və s.)*

**inferior**[2] [ɪn'fɪərɪə'] *adj* **1.** alçaq, aşağı *(vəziyyətə və s. görə)*; kiçik *(rütbəyə və s. görə)*: **the ~ ranks** kiçik rütbələr; **~ grade** *hərb.* kiçik rütbə; **~ strata** cəmiyyətin aşağı təbəqəsi; **~ position** aşağı vəziyyət; **~ level** aşağı səviyyə; *A lieutenant is inferior to a captain Leytenant kapitandan aşağı rütbədir*; **2.** daha pis *(keyfiyyətcə)/*az *(miqdarca)*; **~ in importance** az əhəmiyyətli; *It is inferior to what I expected Bu mənim gözlədiyimdən daha pisdir*; **to be ~ to** *smb.* **in learning** bir kəsə nisbətən daha az savadlı olmaq; **to be ~ in no way to** *smb.* bir kəsdən geri qalmamaq / pis olmamaq; **of ~ quality** pis keyfiyyəti; **~ in quality** keyfiyyətcə pis /aşağı; *The wine is very inferior stuff Şərab çox aşağı keyfiyyətlidir*; **an ~ poet** pis / zəif şair

**inferiority** [ɪnˌfɪərɪ'ɔrɪtɪ] *n* **1.** nisbətən aşağı vəziyyət / keyfiyyət və s.; **~ of rank** qismən aşağı rütbə; **~ of age** daha cavan yaş; **2.** keyfiyyətsizlik, pislik, tam dəyərə malik olmama; **~ of mind** ağıl çatışmazlığı, kəmağıllıq

**infernal** [ɪn'fə:nl] *adj* **1.** cəhənnəm; cəhənnəm kimi, dözülməz; **2.** şiddətli; qeyri-insani, vəhşi, zalım, rəhmsiz; **~ cruelty** qeyri-insani qəddarlıq/zalımlıq; **3.** lənətə gəlmiş; **~ rascal** lənətə gəlmiş yaramaz; **~ nuisance** lap zəhlətökən adam

**infernally** [ɪn'fə:nəlɪ] *adv* **1.** çox, son dərəcə, həddindən artıq; *It is infernally hot Son dərəcə/həddən artıq istidir*; **2.** iblisanə, şeytancasına

**inferno** [ɪn'fə:nou] *n (pl* **-os** [-ouz]) cəhənnəm *(həm də məc)*, cəhənnəmə bənzər yer; **the ~ of war** müharibənin cəhənnəmi / dəhşəti

**infertile** [ɪn'fə:taɪl] *adj* **1.** məhsul verməyən, münbit olmayan; **~ soil** məhsul verməyən torpaq; **2.** balaverməyən, doğmayan, qısır

**infertility** [ˌɪnfə:'tɪlɪtɪ] *n* məhsulvermazlik, münbitsizlik, səmərəsizlik, faydasızlıq; doğmazlıq, qısırlıq

**infest** [ɪn'fest] *v (adət. məchulda işlədilir)* **1.** doldurmaq, daraşmaq; *The house is infested with rats Siçovullar evə daraşıb;* **2.** təngə / zara / cana gətirmək, bezdirmək; *Flies infested horses and cattle Milçəklər atları və mal-qaranı təngə /zara gətirib/bezdirib*

**infestation** [ˌɪnfes'teɪʃn] *n tib.* invaziya *(insan, heyvan və bitkilərin parazitli heyvanlardan yoluxucu xəstəlik tutması)*

**infidel**[1] ['ɪnfɪdl] *n* **1.** bütpərəst; kafir, dinsiz, mürtəd; **2.** allahsız, allaha inanmayan, ateist

**infidel**[2] ['ɪnfɪdl] *adj* **1.** bütpərəstlik; dinsiz, mürtəd; vəfasız; **2.** allaha/dinə inanmayan, ateist; ~ **pamphlet** ateist kitabça

**infidelity** [ˌɪnfɪ'delɪtɪ] *n* **1.** inanmama, inamsızlıq, etimadsızlıq; ateizm, allaha inanmama, dinsizlik; **2.** bütpərəstlik; **3.** vəfasızlıq, əhdi pozma, xəyanət, sədaqətsizlik *(xüs. ər-arvadlıq münasibətlərində); She tolerated her husband's frequent infidelity O, ərinin ona tez-tez etdiyi xəyanətə dözürdü*

**infighting** ['ɪnˌfaɪtɪŋ] *n* **1.** yaxın məsafədən vuruşma *(boksda);* **2.** *hərb.* yaxın məsafədən döyüş

**infiltrate** ['ɪnfɪltreɪt] *v* **1.** süzmək, süzgəcdən keçirmək; **2.** süzülmək, sızmaq, keçmək *(su və s. haq.);* canına çəkdirmək, hopdurmaq; *The water infiltrated the sand Su quma sızıldı;* **3.** *hərb.* keçmək, girmək; soxulmaq; düşmənin arxa cəbhəsinə keçmək

**infiltration** [ˌɪnfɪl'treɪʃn] *n tib.* **1.** infiltrasiya *(orqanizmin hüceyrə və toxumalarına yad maddələrin keçməsi və orada toplanması);* **2.** sızma, keçmə; **the ~ of sea-water** dəniz suyunun sızması; **the ~ of ideas** fikirlərin sızması/keçməsi; **3.** *hərb.* düşmənin arxa cəbhəsinə keçmə

**infinite**[1] ['ɪnfɪnɪt] *n* **1.** nəhayətsizlik, sonsuzluq, intəhasızlıq, ucu-bucağı olmama; hədsizlik; **2. the Infinite** Allah; **3.** *riyaz.* sonsuz böyük kəmiyyət

**infinite**[2] ['ɪnfɪnɪt] *adj* **1.** nəhayətsiz, sonsuz, intəhasız, ucsuz-bucaqsız, ucu-bucağı olmayan, hədsiz; ~ **time** nəhayətsiz/sonsuz vaxt; ~ **space** nəhayətsiz/intəhasız/ucsuz-bucaqsız məkan; ~ **wisdom** hədsiz/sonsuz müdriklik; ~ **kindness** sonsuz/intəhasız mərhəmət; ~ **patience** sonsuz/intəhasız hövsələ / dözüm / səbr; *You need infinite patience for this job Bu işi görmək üçün sənə/sizə çox böyük səbr lazımdır;* **2.** *riyaz.* sonsuz; ~ **decimal** sonsuz onluq kəsr; ~ **series** sonsuz sıra/cərgə; **3.** saysız-hesabsız, hesaba/sayahesaba gəlməyən, son dərəcə çox; ~ **number** saya-hesaba gəlməyən rəqəm; **4.** *qram.* şəxssiz

**infinitely** ['ɪnfɪnɪtlɪ] *adv* sonsuz / intəhasız olaraq; son dərəcə, intəhasız, hədsiz; ~ **large** son dərəcə böyük; ~ **many** son dərəcə çox; **to be ~ obliged to** *smb.* bir kəsə hədsiz dərəcədə borclu/minnətdar olmaq; **to be ~ indebted to** *smb.* bir kəsə sonsuz dərəcə borclu olmaq

**infinitesimal** [ˌɪnfɪnɪ'tesɪml] *adj* **1.** çox kiçik / xırda, ölçüyə gəlməyəcək dərəcədə kiçik; **2.** *riyaz.* son dərəcə kiçik, sıfra yaxınlaşan

**infinitival** [ɪnˌfɪnɪ'taɪvəl] *adj qram.* **1.** məsdər; ~ **constructions** məsdər birləşmələri / tərkibləri

**infinitive**[1] [ɪn'fɪnɪtɪv] *n qram.* məsdər, felin şəxssiz forması

**infinitive**[2] [ɪn'fɪnɪtɪv] *adj qram.* məsdər; ~ **phrase** məsdər birləşməsi / tərkibi

**infinity** [ɪn'fɪnətɪ] *n* **1.** sonsuzluq; **the ~ of space** kainatın sonsuzluğu; **to gaze into ~** gözlərini sonsuzluğa zilləmək; **to ~** sonsuzluğa qədər/kimi; **2.** son dərəcə böyük miqdar; **3.** *riyaz.* sonsuzluq, sonsuz rəqəm; ? işarəsilə bildirilən /göstərilən miqdar

**infirm** [ɪn'fɜ:m] *adj* **1.** zəif, gücsüz, taqətsiz, qocalıb əldən düşmüş; **to grow old and ~** qocalıb əldən düşmək; **old and ~** qoca və taqətsiz/zəif; ~ **constitution** zəif /taqətsiz bədən/orqanizm; **2.** möhkəm olmayan, səbatsız, qətiyyətsiz

**infirmity** [ɪn'fɜ:mɪtɪ] *n* **1.** zəiflik, gücsüzlük, taqətsizlik; **the ~ of old age** qocalıq zəifliyi/ taqətsizliyi; **2.** bədəndə olan çatışmazlıq; nöqsan, qüsur; *Bad temper is his worst infirmity Hövsələsizlik / Səbrsizlik onun ən pis nöqsanıdır*

**infix** ['ɪnfɪks] *n qram.* infiks *(flektiv dillərdə söz düzəltdikdə və ya söz dəyişdirdikdə söz kökünün ortasına əlavə edilən şəkilçi)*

**inflame** [ɪn'fleɪm] *v* **1.** alovlandırmaq, alışdırmaq, yandırmaq; **2.** həyəcanlandırmaq, həyəcana salmaq/gətirmək; həyəcanlanmaq, həyəcana gəlmək; qızışdırmaq; **to ~ public opinion** ictimai fikri həyəcana gətirmək; **to ~ the audience** auditoriyanı həyəcanlandırmaq; **to ~ animosity** düşmənçiliyi qızışdırmaq; **3. (with)** alovlanmaq, alışıb yanmaq; **to be ~d with love** məhəbbətdən alovlanmaq / alışıb yanmaq; *The tale inflamed his ambition Əhvalat onun arzusunu alovlandırdı;* **4.** *tib.* iltihablanmaq, hovlanmaq; *His eyelids are inflamed Onun göz qapaqları soyuqlayıb /qızarıb*

**inflamed** [ɪn'fleɪmd] *adj* **1.** həyəcanlanmış; ~ **with passion** ehtirasdan həyəcanlanmış; **2.** *tib.* soyuqlamış, iltihabdan qızarmış/ şişmiş; ~ **eyes** qızarmış gözlər; *My eyes became red and inflamed Mənim gözlərim qızarıb və şişib*

**inflammable** [ɪn'flæməbl] *adj* tezalovlanan; ~ **material** tezalovlanan material; ~ **gases** tezalovlanan qazlar; **2.** çılğın; hirsli, tündxasiyyət, tündməcaz, tez hirslənən/özündən çıxan; ~ **temper** tündməcaz / çılğın xasiyyət

**inflammation** [ˌɪnflə'meɪʃn] *n* **1.** alovlanma, alışma; **2.** əsəbiləşdirmə, acıqlandırma; acıqlanma, əsəbiləşmə; hiddət, qəzəb; hiddətlənmə, qəzəblənmə; od alma, alışma; **in a state of extreme ~** həddindən artıq əsəbi vəziyyətdə; **3.** *tib.* iltihab; hov çəkmə; ~ **of the lungs** ciyərlərin iltihabı, sətəlcəm



**inflammatory** [ɪn'flæmətərɪ] *adj* **1.** oyadan, oyandıran, hərəkətə gətirən; **2.** təhrikedici, qızışdırıcı; ~ **speech** təhrikedici / qızışdırıcı nitq; ~ **book** təhrikedici kitab; **3.** *tib.* iltihablanmış, iltihabdan qızarmış /şişmiş; hovlanmış; **an ~ condition of the liver** qara ciyərin iltihablanmış vəziyyəti

**inflate** [ɪn'fleɪt] *v* **1.** doldurmaq *(hava ilə, qazla),* üfürüb şişirtmək, köpürtmək; hava doldurmaq *(nasosla);* **to ~ a balloon** şarı üfürüb doldurmaq, şişdirmək; **2.** şişirtmək, artırmaq, qaldırmaq *(qiyməti və s.)*

**inflated** [ɪn'fleɪtɪd] *adj* **1.** üfürülmüş, doldurulmuş *(hava və ya qazla)*; köpdürülmüş, köpmüş; ~ **balloon** hava və ya qazla doldurulmuş /üfürülmüş şar; ~ **tire** doldurulmuş şin; **2.** təmtəraqlı, ibarəli; ~ **style** təmtəraqlı üslub; **3.** şişirdilmiş, qaldırılmış *(qiymət haq.)*; ~ **prices** şişirdilmiş qiymətlər; ~ **salaries** şişirdilmiş/qaldırılmış məvaciblər

**inflation** [ɪn'fleɪʃn] *n* **1.** hava üfürmə / doldurma, üfürüb şişirtmə, köpürtmə; **2.** şişmə, köpmə, qabarma; **dough ~** xəmirin köpməsi *(yəni acıması);* **3.** təmtəraqlılıq; ~ **of style** üslubun təmtəraqlılığı; **4.** *mal.* inflyasiya *(həddən artıq kağız pul buraxılması və bunun nəticəsində pulun qiymətdən düşməsi);* **to border on ~** inflyasiya həddində olmaq; **to head for ~** inflyasiyaya yuvarlanmaq

**inflect** [ɪn'flekt] *v* **1.** içəri əymək / bükmək /qatlamaq; çökəkləşdirmək; **2.** *qram.* şəkilçi əlavə etmək, şəkilçini dəyişmək

**inflected** [ɪn'flektɪd] *adj* **1.** içəri əyilmiş / qatlanmış / bükülmüş; **2.** *qram.* şəkilçili, qrammatik baxımdan dəyişən; ~ **language** şəkilçili dil; *Russian is a highly inflected language Rus dili çox şəkilçili dildir*

**inflection** [ɪn'flekʃn] *n* = **inflexion**

**inflectional** [ɪn'flekʃnl] *adj* = **inflexional**

**inflective** [ɪn'flektɪv] *adj* **1.** içəri əyilən / bükülən /əyilən; **2.** = **inflexional; an ~ language** şəkilçili dil

**inflexibility** [ɪnˌfleksə'bɪlɪtɪ] *n* **1.** əyilməzlik, qatlanmazlıq, bükülməzlik; rəhmsizlik, qəddarlıq, zalımlıq; **2.** möhkəmlik, yenilməzlik, mətanət, fikrindən dönməzlik

**inflexible** [ɪn'fleksəbl] *adj* **1.** əyilməyən, bükülməyən, elastik olmayan, əyilməz, sərt, bərk, cod; ~ **plastic** əyilməyən/bərk plastik; ~ **blade** əyilməz tiyə; ~ **twigs** əyilməz/bərk budaqlar; **2.** mətin, mətanətli, möhkəm, sarsılmaz, yenilməz; ~ **will** möhkəm/yenilməz/sarsılmaz iradə; ~ **courage** möhkəm/yenilməz / sarsılmaz cəsarət; ~ **determination** mətin/yenilməz / sarsılmaz qətiyyət; *She is inflexible O, yenilməzdir / əzmlidir*

**inflexion** [ɪn'flekʃn] *n* **1.** əymə, qatlama, bükmə; **2.** döngə, dirsək, bükük; ~ **of the body** bədənin büküyü; ~ **of the road** yolun döngəsi; **3.** *qram.* fleksiya *(sözlərin hallanma və ya təsrif zamanı dəyişən sonluğu)*, şəkilçi; **4.** modulyasiya *(səsin bir tondan başqasına keçməsi); It was not her words, but her inflexion that hurt me Mənə toxunan onun sözləri deyil, onun bu sözləri demə tərzi idi*

**inflexional** [ɪn'flekʃnl] *adj dilç.* flektiv; ~ **languages** flektiv dillər *(söz formaları yalnız şəkilçilər vasitəsilə deyil, həmçinin fleksiyalar vasitəsilə də düzələn dillər)*

**inflict** [ɪn'flɪkt] *v* **(on, upon) 1.** endirmək, vermək, vurmaq *(zərbə, ziyan və s.)*; **to ~ losses on** *smb.* bir kəsə itki vermək; **to ~ damage on** *smb.* bir kəsə ziyan vurmaq /vermək; **2.** *məc.* vermək, etmək *(əziyyət, cəza, ağrı və s.)*; **to ~ shame on** *smb.* bir kəsi rüsvay etmək; *The judge inflicted the death penalty on the criminal Hakim cinayətkara ölüm cəzası verdi;* **to ~ one's views on/upon** *smb.* öz fikirlərini bir kəsə zorla qəbul etdirmək; **to ~ oneself on/upon** *smb.* bir kəsdən əl çəkməmək, bir kəsin boğazına keçmək

**inflow**[1] ['ɪnflou] *n* = **influx**

**inflow**[2] [ɪn'flou] *v* tökülmək, axıb qarışmaq, axıb tökülmək *(bir şeyin üstünə)*

**influence**[1] ['ɪnfluəns] *n* təsir; nüfuz; **under the ~ of** təsiri altında; **to have an ~ over** *smb.* bir kəsə təsiri olmaq; *His parents no longer have any real influence over him Artıq valideynlərinin ona heç bir real təsiri yoxdur;* **to have ~ with** *smb.* bir kəsə təsir etmək; **the ~ of example** nümunənin təsiri; **by virtue of / due to his ~** onun təsiri sayəsində; **within / in the range of his ~** onun təsir dairəsində; **a man of ~** nüfuzlu adam; **an ~ on/upon** *smb.'s* **decision** bir kəsin qərarına təsir etmə; **to strengthen** *one's* **~ on** *smb.* bir kəsə təsirini gücləndirmək; **to lessen /to diminish /to reduce** *one's* **~ on** *smb.* bir kəsin üzərində təsirini azaltmaq; **to come/to fall under** *smb.'s* **~** bir kəsin təsiri altına düşmək; **to be subject to** *smb.'s* **~** bir kəsin təsirinə məruz qalmaq; **the ~ of the press and television** mətbuatın və televiziyanın təsiri; **the ~ of the climate on agricultural production** iqlimin kənd təsərrüfatı məhsuluna təsiri

**influence**[2] ['ɪnfluəns] *v* təsir göstərmək / etmək; *I don't want to influence you either way, so I won't tell you my opinion Mən sənə / sizə eləbelə təsir etmək istəmirəm, buna görə də öz fikrimi sənə / sizə deməyəcəm*

**influential** [ˌɪnflu'enʃl] *adj* **1.** təsirli, təsir göstərə bilən; mötəbər, nüfuzlu; **an ~ man** mötəbər / nüfuzlu adam; **to be ~ with** *smb.* bir kəsə böyük təsiri olmaq; **2.** vacib, həlledici təsirə malik olan; ~ **circumstances** mühüm/vacib şərait

**influenza** [ˌɪnflu'enzə] *n tib.* qrip, inflüensa *(xəstəlik)*

**influx** ['ɪnflʌks] *n* **1.** axma, tökülmə, axıb tökülmə; **the ~ of a river into the sea** çayın də-

nizə tökülməsi; 2. axın; ~ **of light/ air** işıq/hava axını; **an ~ of refugees** qaçqınların axını; **the ~ of Greek into modern languages** yunan dili sözlərinin müasir dillərə axını; 2. çay ağzı, mənsəb *(çayda)*

**info** [ˈɪnfou] *n jarq.* məlumat, informasiya; *For further info phone 686821 Əlavə məlumat üçün 686821 saylı telefona zəng vur / vurun*

**inform** [ɪnˈfɔ:m] *v* **1.** bildirmək, xəbər / məlumat vermək, xəbər / məlumat göndərmək; **to ~ smb. of smth.** bir kəsə bir şey haqqında məlumat/xəbər vermək; *If I am rightly informed... Əgər mənə doğru məlumat veriblərsə...; Herewith I inform you that... Bununla əlaqədar olaraq mən sənə/sizə bildirirəm ki,..;* **2. (on, against)** məlum etmək, donos vermək, çuğulluq etmək; **to ~ smb. on smb.** bir kəs haqqında çuğulluq etmək; *One of the gang informed against/on the rest Bandanın bir üzvü qalanları haqqında çuğulluq etdi;* **3.** doldurmaq, ruhlandırmaq; **to ~ one's heart with pity** qəlbini mərhəmətlə doldurmaq

**informal** [ɪnˈfɔ:ml] *adj* **1.** qeyri-rəsmi; **an ~ meeting/dinner** qeyri-rəsmi görüş/nahar; **~ conversations between the representatives of two countries** iki ölkə nümayəndələri arasında qeyri-rəsmi danışıqlar; **2.** sərbəst, sadə, təklifsiz

**informality** [ˌɪnfɔ:ˈmælɪtɪ] *n* qeyri-rəsmilik; sadəlik, sərbəstlik

**informally** [ɪnˈfɔ:məlɪ] *adv* qeyri-rəsmi olaraq; *They told me informally that I had got the job Onlar mənə qeyri-rəsmi olaraq dedilər ki, məni işə götürüblər*

**informant** [ɪnˈfɔ:mənt] *n* xəbərçi, xəbərverən, məlumat verən; məsləhətçi

**information** [ˌɪnfəˈmeɪʃn] *n* **1.** xəbər, məlumat; **accurate ~** dəqiq məlumat; **statistical ~** statistik məlumat; **private ~** xüsusi məlumat; **to get/to receive/to gain / to obtain ~** məlumat almaq; **to turn in/to give ~** məlumat vermək/təqdim etmək; **to gather ~ about smb.** bir kəs haqqında məlumat toplamaq; **to apply to smb. for ~** məlumat üçün bir kəsə müraciət etmək; **to send ~ of smth.** bir şey haqqında məlumat göndərmək; **according to the latest ~** son məlumata görə; **useful bit/ piece of ~** yaxşı/xeyirli xəbər; *According to my information work was due to start last week Mənim məlumatıma görə iş keçən həftə başlamalı idi;* **2.** xəbərdar etmə, xəbər/məlumat vermə; informasiya; *(kibernetikada)*; **to enter ~** informasiyanı qeyd etmək/yazmaq; **3.** xəbərdar/məlumatı olma; bilik; **a man of vast ~** geniş bilikli / məlumatlı adam; **4.** şeytanlama, donos vermə; **to lodge ~ against smb.** bir kəsdən donos vermək

**informational** [ˌɪnfəˈmeɪʃnl] *adj* məlumat; **~ bureau** məlumat bürosu; **~ agent** *hərb.* məlumat agentliyi

**informative** [ɪnˈfɔ:mətɪv] *adj* **1.** məlumat; məlumat verən; **2.** ibrətli, ibrətamiz, ibrət alınacaq, faydalı; məzmunlu, mənalı, dolğun; **~ article/book** məzmunlu məqalə / kitab; *The book is informative Bu kitab ibrətamizdir/faydalıdır*

**infract** [ɪnˈfrækt] *v* pozmaq, qırmaq; **to ~ the constitution** konstitusiyanı/anayasanı pozmaq; **to ~ neutrality** bitərəfliyi pozmaq

**infraction** [ɪnˈfrækʃn] *n* **1.** pozma, riayət etməmə *(qanuna və s.)*; **~ of a law** qanunun pozulması, qanuna riayət etməmə; **2.** *id.* qaydanı pozma, qaydaya riayət etməmə; **3.** *tib.* çatlama, çatlaq, çatlaq/sınıq yer

**infra-red** [ˌɪnfrəˈred] *adj fiz.* infraqırmızı; **~ rays** infra-qırmızı şüalar *(dalğa uzunluğu qırmızı şüalarınkından uzun olan, gözlə görünməyən istilik şüaları)*

**infra-sound** [ˈɪnfrəsaund] *n fiz.* infrasəs *(insan qulağı eşitməyən aşağı tezlikli titrəyişlər)*

**infrequency** [ɪnˈfri:kwənsɪ] *n* az təsadüf edilən, nadir hadisə/şey; qeyri-müntəzəmlik

**infrequent** [ɪnˈfri:kwənt] *adj* nadir, az təsadüf edilən / olunan / rast gələnən; **~ occurrence** nadir/az təsadüf edilən hadisə; **~ opportunity** nadir imkan; *Such cases are relatively infrequent Belə hallara nisbətən gec-gec təsadüf edilir*

**infrequently** [ɪnˈfri:kwəntlɪ] *adv* nadir hallarda, gec-gec, təsadüfdən-təsadüfə; *This happens not infrequently Bu tez-tez baş verir*

**infringe** [ɪnˈfrɪndʒ] *v* **1.** pozmaq, riayət etməmək; **to ~ a law/a contract/a copyright** qanunu /müqaviləni/müəlliflik hüququnu pozmaq; **2. (on, upon)** qəsd etmək, əl uzatmaq/atmaq, toxunmaq; **to ~ on/upon smb.'s rights** bir kəsin hüquqlarına toxunmaq; **to ~ on a nation's sovereignty** dövlətin müstəqilliyinə toxunmaq / müstəqilliyini pozmaq

**infringement** [ɪnˈfrɪndʒmənt] *n* **1.** pozma, riayət etməmə; **the ~ of human rights/of copyrights / of a treaty/of a law/of the constitution** insan hüquqlarını/ müəlliflik hüququnu/müqaviləni /qanunu/konstitusiyanı pozmaq; **2. (on, upon)** qəsd, qəsd etmə, əl uzatma; **an ~ upon / on liberty** azadlığa qəsd / qəsd etmə

**infuriate** [ɪnˈfjuərɪeɪt] *v* qəzəbləndirmək, hiddətləndirmək, qeyzləndirmək, özündən çıxartmaq; **to ~ smb. with smth.** bir kəsi bir şeylə hiddətləndirmək / qəzəbləndirmək; *Their constant criticism infuriated me Onların arası kəsilməyən tənqidi məni hiddətləndirdi;* **to be ~d at smth.** bir şeyə qəzəblənmək, bir şeyə görə özündən çıxmaq

**infuse** [ɪnˈfju:z] *v* **1.** tökmək; **2.** təlqin etmək, təsir etmək, beyninə yeritmək; doğurmaq, törətmək, əməle gətirmək; oyatmaq; **to ~ hope into smb.** bir kəsdə ümid oyatmaq / doğurmaq; **to ~ smb. with determination** bir kəsdə qətiyyət doğurmaq; *These words infused life into me Bu*



*sözlər məndə yenidən həyata məhəbbət oyatdı;* **3.** dəmləmək, dəmlənmək, dəmə qoymaq *(çay, kofe və s.)*; **to ~ herbs 1)** ot dəmləmək *(müalicəvi ot)*; **2.** dəmlənmək *(müalicəvi ot və s. haq.)*; *Leave the tea to infuse Qoy / Qoyun çay dəmlənsin*

**infusion** [ɪnˈfju:ʒn] *n* **1.** tökmə; **2.** *tib.* vurma, köçürmə *(müalicə məqsədilə bədənə qan və s. vurma/köçürmə)*; **3.** təlqin etmə *(fikri və s.)*; **4.** dəmləmə, dəm; **5.** qatışıq, aşqar

**infusive** [ɪnˈfju:zɪv] *adj* ilhamverən, ilhamverici, ilhamlandırıcı, ruhverən, ruhlandırıcı; **~ force of spring** yazın / baharın ruhlandırıcı / canlandırıcı qüvvəsi

**-ing** [-ɪŋ] *suff.* **1.** şəkilçi; *felin kökünə əlavə edilərək ismi xəbər düzəldir:* **reading** oxu, oxuma, qiraət; **building** bina; **lodging** mənzil, ev, məskən; **hearing** eşitmə, eşitmə qabiliyyəti və s.; **2.** *fel kökündən* **gerund** *düzəltmək üçün işlədilir: I like drawing Mən şəkil çəkməyi xoşlayıram; She left the room without saying a word Bir söz demədən o, otağı tərk etdi; Seeing is believing Göz gördüyünə inanar və s;* **3.** *felin kökündən feli sifət I formasını düzəltmək üçün işlədilir: I'm speaking Mən danışıram; Leaving the door open, she went away Qapını açıq qoyaraq o çıxıb getdi;* **a playing** child oynayan uşaq *və s.*

**ingenious** [ɪnˈdʒi:njəs] *adj* **1.** yaradıcı, bacarıqlı; zirək; mahir, məharətli, qabil; usta; **~ mind** yaradıcı təfəkkür; **~ mechanic** məharətli/bacarıqlı/usta/mexanik; **2.** çox mürəkkəb, məharətlə düzəldilmiş; **~ machine** mürəkkəb maşın; **~ structure** mürəkkəb quruluş; **3.** ağıllı, orijinal; **~ performance** orijinal tamaşa; **~ reply** ağıllı cavab

**ingeniously** [ɪnˈdʒi:njəslɪ] *adv* yaradıcılıqla, bacarıqla, qabiliyyətlə, ustalıqla, ağılla

**ingenue** [ˌænʒeɪˈnju:] *n (pl* **-nues** [-ˈnju:z]) *fr.* injenyu *(sadəlövh qız rolu; bu rolu oynayan aktrisa)*

**ingenuity** [ˌɪndʒɪˈnju:ɪtɪ] *n* **1.** ixtiraçılıq, ixtiraçılıq qabiliyyəti; mahirlik, məharətlilik, ağıllılıq; ustalıq; bacarıqlılıq; **the ~ of a man** insanın ixtiraçılıq qabiliyyəti; **to set one's ~ to work** ağlını / bacarığını işə sərf etmək

**ingenuous** [ɪnˈdʒenjuəs] *adj* **1.** səmimi, ürəyiaçıq, həqiqi, təmizürəkli; düz, açıq; **~ confession** səmimi/açıq etiraf; **~ declaration** səmimi bəyanat; **an ~ smile** səmimi təbəssüm; **2.** açıq, ürəyiaçıq, sadədil, hiyləsiz, məsum; **~ child** sadədil/məsum uşaq

**ingenuously** [ɪnˈdʒenjuəslɪ] *adv* səmimi / ürəyiaçıq bir tərzdə, ürəyiaçıqlıqla, səmimiliklə

**ingest** [ɪnˈdʒest] *v* **1.** udmaq, qida qəbul etmək; **2.** əxz etmək *(elmi, məlumatı, fikri və s.)*; **to ~ information** məlumatı əxz etmək

**inglenook** [ˈɪŋglnuk] *n* ocağın / buxarının yanında oturmaq üçün yer

**ingle-side** [ˈɪŋglsaɪd] *n* = **fireside**

**inglorious** [ɪnˈglɔ:rɪəs] *adj* şərəfsiz, bədnam, hörmətsiz; biabırçı, rüsvayçı, eyibli, utanmalı; **~ defeat** şərəfsiz/biabırçı məğlubiyyət; **an ~ page in the nation's history** xalqın/ millətin tarixində şərəfsiz səhifə

**ingloriously** [ɪnˈglɔ:rɪəslɪ] *adv* şərəfsizcəsinə, biabırçı bir surətdə, rüsvayçılıqla

**ingoing** [ˈɪnˌgouɪŋ] *adj* gələn, varid olan, gəlib çıxan; **~ vessel** gələn/varid olan gəmi

**ingot** [ˈɪŋgət] *n* külçə, əridilib qəlibə tökülmüş polad *(adət. gümüş və ya qızıl)*

**ingrained** [ɪnˈgreɪnd] *adj* **1.** anadangəlmə; köksalmış; kökbağlamış; islahedilməz; **~ honesty** anadangəlmə səmimiyyət/düzlük; **~ habits** köksalmış/islahedilməz adətlər; **2.** köhnə, canına hopmuş/yerimiş; **~ dirt** canına yerimiş / hopmuş çirk

**ingratiate** [ɪnˈgreɪʃɪeɪt] *v (passivdə işlənmir)*; **to ~ oneself** rəğbət qazanmaq; qılığa girmək; **to ~ oneself into smb.'s favour, to ~ oneself with smb.** bir kəsin etimadını/rəğbətini qazanmaq *(yaltaqlıq, tərifləmə və s. ilə); She tried to ingratiate herself with the director, in the hope of getting promotion Vəzifədə irəliləmək ümidilə o, direktorun rəğbətini qazanmağa çalışırdı*

**ingratiating** [ɪnˈgreɪʃɪeɪtɪŋ] *adj* məftunedici, valehdici, cazibədar, cəlbedici, heyranedici, füsunkar; **~ smile** füsunkar / cazibədar / cəzbedici təbəssüm

**ingratiatingly** [ɪnˈgreɪʃɪeɪtɪŋlɪ] *adv* füsunkarcasına, valehedici/ məftunedici / heyranedici bir surətdə

**ingratitude** [ɪnˈgrætɪtju:d] *n* naşükürlük, yaxşılıq bilməmə; **~ to smb.** bir kəsə qarşı nankorluq

**ingredient** [ɪnˈgri:djənt] *n* tərkib hissəsi, komponent; **the ~s of soap** sabunun tərkib hissələri / komponentləri; **the ~s of a medicine** dərmanın tərkib hissələri/komponentləri

**ingress** [ˈɪngres] *n* **1.** daxil olma, girmə; **the ~ of air into the lungs** havanın ciyərlərə daxil olması; **2.** daxil olma hüququ; **3.** giriş; *Ingress was prohibited Giriş qadağan olunmuşdu*

**ingrowing** [ˈɪngrouɪŋ] *adj* içəriyə doğru inkişaf edən / böyüyən *(xüs. dırnaq haq.)*; **an ~ toenail** içəriyə (ətin içinə) inkişaf edən ayaq barmağının dırnağı

**ingrown** [ˈɪngroun] *adj* ətəgirmiş *(dırnaq haq)* **~ nail** ətəgirmiş dırnaq

**inhabit** [ɪnˈhæbɪt] *v* yaşamaq, sakin olmaq, məskunlaşmaq; **an island ~ed only by birds** yalnız quşların yaşadığı ada; *Who inhabits the island? Bu adada kim yaşayır?; Fishes inhabit the seas / the rivers Balıqlar dənizlərdə / çaylarda yaşayır*

**inhabitant** [ɪnˈhæbɪtənt] *n* (daimi) sakin; **an ~ of the mountains** dağların sakini; **the oldest ~** ən qədim sakin; *This village has more than 800 inhabitants Bu kəndin 800-dən artıq sakini var*

**inhale** [ɪnˈheɪl] *v* **1.** nəfəs / hava almaq; **to ~ air** hava almaq; *I want you to inhale deeply Mən istəyi-*

*rəm ki, sən/siz dərindən nəfəs alasan/alasınız;* 2. papiros tüstüsünü ciyərlərə çəkmək, dərin qullab vurmaq; **to ~ cigarette smoke** siqaret tüstüsündən qullab vurmaq; 3. *tib.* inhalyasiya etmək *(buxar, qaz və ya toz halına salınmış maye və maddələrlə nəfəs alma vasitəsilə müalicə etmək)*

**inhaler** [ɪn'heɪləʳ] *n tib.* inhalyator *(inhalyasiya cihazı)*

**inharmonious** [ˌɪnhaː'mounjəs] *adj* uyuşmayan, ahəngsiz; həmahəng/uyğun olmayan, düz gəlməyən; **~ colours** uyuşmayan / uyğun gəlməyən rənglər

**inherent** [ɪn'hɪərənt] *adj* 1. xas, məxsus, aid, xas/məxsus/aid olan; **to be ~ in** ***smth.*** bir şeyə xas/aid olmaq; 2. ayrılmaz, aralanmaz, ayrılması mümkün olmayan; **~ rights** ayrılmaz hüquqlar; 3. anadangəlmə, fitri; **~ talent** anadangəlmə/fitri istedad; **~ modesty** anadangəlmə təvazökarlıq

**inherently** [ɪn'hɪərəntlɪ] *adv* özünəməxsus bir tərzdə / surətdə

**inherit** [ɪn'herɪt] *v* 1. irsən almaq/əldə etmək; varis olmaq; **to ~ a fortune / land / property** irsən var-dövlət/ torpaq / əmlak əldə etmək; 2. varis/vərəsə olmaq; *A son inherits from his father Oğul atanın varisi olur;* **to ~ abilities** qabiliyyətləri irsən almaq; *She inherited her mother's good looks and her father's bad temper O, irsən anasından gözəllik, atasından isə hövsələsizlik alıb / əxz edib*

**inheritable** [ɪn'herɪtəbl] *adj* 1. irsən keçən / keçə bilən, irsən alınan/alına bilən; **~ titles/property** irsən keçən titul/əmlak; 2. irsən almağa/sahib olmağa ixtiyarı olan; **to be ~ to** ***smth.*** bir şeyi irsən almağa ixtiyarı olmaq

**inheritance** [ɪn'herɪtəns] *n* 1. irsən alma / alınma; varis olma; **to receive / to obtain** ***smth.*** **by ~** bir şeyi irsən almaq, bir şeyə irsən sahib olmaq; 2. irsən keçmə *(xüsusiyyət, xasiyyət və s.)*; 3. miras, irs; varislik, irsən alınmış əmlak; **the right of ~** varislik hüququ; **to leave an ~ to** ***smb.*** bir kəsə miras qoyub getmək; **to lay claim to an ~** varislik tələbi irəli sürmək; 4. *biol.* irsiyyət; **good ~** yaxşı irsiyyət

**inherited** [ɪn'herɪtɪd] *adj* irsən alınmış/keçmiş; irsi; **~ quality** irsən keçmiş/irsi keyfiyyət

**inheritor** [ɪn'herɪtəʳ] *n* varis, vərəsə; *We are the inheritors of a great cultural tradition Biz böyük bir mədəni ənənənin varisləriyik*

**inheritress** [ɪn'herɪtrɪs] *n* varis qız/qadın, vərəsə qız/qadın

**inhibit** [ɪn'hɪbɪt] *v* 1. **(from** ***smth.*****/doing** ***smth.*****)** qadağan/yasaq etmək, qadağa qoymaq, başını bağlamaq; **to ~** ***smb.*** **from doing** ***smth.*** bir kəsə bir şey etməyi qadağan / yasaq etmək; **to ~ the use of** ***smth.*** bir şeydən istifadə etməyi qadağan etmək; 2. mane olmaq, maneçilik törətmək; 3. boğmaq, qarşısını almaq; **to ~** ***one's*** **desire to do** ***smth.*** özünün bir şey etmək arzusunu boğmaq; **to ~ oneself** özünü saxlamaq

**inhibition** [ˌɪnhɪ'bɪʃn] *n* 1. qadağan, yasaq, qadağan / yasaq etmə; 2. özünü saxlama, təmkin; boğma *(hissi və s.)*

**inhospitable** [ɪn'hɔspɪtəbl] *adj* 1. qonaqsevməz, qonaq sevməyən; qaraqabaq, üzügülməz, qaşqabaqlı; 2. məyus, qəmgin, kədərli, soyuq, hüznlü; sərt; **~ shore** sərt sahil; **~ climate** sərt iqlim

**inhospitality** ['ɪnˌhɔspɪ'tælɪtɪ] *n* 1. qonaqsevməzlik; qaşqabaqlılıq, üzügülməzlik, soyuqluq; 2. məyusluq, qəmginlik, kədərlilik, hüznlülük

**inhuman** [ɪn'hjuːmən] *adj* qeyri-insani, insafsız, rəhmsiz, zalım, amansız, qəddar, mürvətsiz; **~ deed** insafsız/qəddar hərəkət; **~ treatment** qeyri-insani / rəhmsiz münasibət; **~ tyrant** zalım/insafsız hökmdar; **~ cruelty** qeyri-insani qəddarlıq

**inhumane** [ˌɪnhjuː'meɪn] *adj* insaniyyətsiz, vəhşi, insafsız, zalım, rəhmsiz, qəddar

**inhumanely** [ˌɪnhjuː'meɪnlɪ] *adj* zalımcasına, qəddarlıqla, vəhşiliklə, amansızcasına

**inhumanity** [ˌɪnhjuː'mænətɪ] *n* insaniyyətsizlik, vəhşilik, insafsızlıq, zalımlıq, rəhmsizlik, qəddarlıq

**inimical** [ɪ'nɪmɪkl] *adj* 1. düşmən, düşməncəsinə; qeyri-səmimi, pis niyyətli, kinli, ədavətli, qərəzli, bədxah, pisniyyət; **~ to one another** bir-birinə düşmən; 2. əlverişsiz, arzu edilməyən, istənilməyən, mənfi; zərərli, ziyanlı, ziyankar, xətərli; **circumstances ~ to success** nailiyyət üçün əlverişsiz vəziyyət; *His attitude is inimical to our project Bizim plana onun münasibəti mənfidir;* **to be ~ to** ***one's*** **health** sağlamlığa ziyanlı / xətərli olmaq; **conditions ~ to comfort** istirahət üçün əlverişsiz şəraitlər

**inimitable** [ɪ'nɪmɪtəbl] *adj* misilsiz, tayı-bərabəri olmayan; təkraredilməz, müstəsna; müqayisəedilməz, çox gözəl / qəşəng; **~ style** misilsiz / təkraredilməz / müstəsna üslub

**iniquitous** [ɪ'nɪkwɪtəs] *adj* dəhşətli, qorxulu, qorxunc, müdhiş; ədalətsiz, insafsız, haqsız; **~ punishment** ədalətsiz / haqsız cəza; **an ~ decision** ədalətsiz qərar

**iniquity** [ɪ'nɪkwɪtɪ] *n* ədalətsizlik; qeyri-qanunilik, qanuna zidlik/zidd olma, qanunsuzluq; pislik, yamanlıq, pis iş, şər; **the ~ of fortune** taleyin ədalətsizliyi

**initial**[1] [ɪ'nɪʃl] *n (adət. pl)* inisial *(ad, soy və ya ata adının baş hərfləri); John Fitzgerald Kennedy was well-known by his initials JFK Con Ficerald Kennedi özünün CFK inisialı ilə məşhur idi; Just write your initials Ancaq inisiallarını / inisiallarınızı yaz / yazın*

**initial**[2] [ɪ'nɪʃl] *adj* baş, başlanğıc; birinci, əvvəlinci, əvvəlki, ən birinci, ilk; **~ letter** 1) birinci /əvvəlinci hərf; 2) baş/böyük hərf; **~ attempt /efforts** birinci/ilk cəhd/ səylər; **the ~ symptoms of a disease** *tib.* xəstəliyin ilk əlamətləri; **~ cost** *mal.* başlanğıc / ilk qiymət



**initial**[3] [ɪ'nɪʃl] *v* inisiallarını yazmaq; imza əvəzinə inisiallarını yazmaq; **to ~ a note** məktuba /kağıza inisiallarını yazmaq; *The artist has initialled the picture at the bottom Rəssam şəklin altında öz inisiallarını yazdı*

**initially** [ɪ'nɪʃəlɪ] *adv* əvvəlcə, başlanğıcda, ilk / ən əvvəl; başlanğıc mərhələdə; *Initially she was very lonely, but now she has made a few friends Əvvəlcə o, lap yalqız idi, amma indi onun bir neçə dostu var; My contract is initially for three years Mənim müqaviləm başlanğıcda üç ilə nəzərdə tutulmuşdur*

**initiate** [ɪ'nɪʃɪeɪt] *v* 1. başlamaq; girişmək, qoşulmaq; **to ~ discussions/social reforms** müzakirələrə/ictimai islahatlara başlamaq; **to ~ work** işə başlamaq; 2. təşəbbüs göstərmək; təklif etmək; **to ~ a plan** plan təklif etmək; **to ~ a reform** islahat təklif etmək; 3. **(into)** tanış etmək, öyrətmək *(elm, sənət və s.)*; **to ~ a pupil into the elements of grammar** şagirdi qrammatikanın əsasları ilə tanış etmək, şagirdlərə qrammatikanın əsaslarını öyrətmək; **to ~** ***smb.*** **into a trade** bir kəsə sənət öyrətmək; 4. **(into)** qəbul etmək *(cəmiyyətə və s.)*; **to ~** ***smb.*** **into a club** bir kəsi kluba üzv qəbul etmək

**initiation** [ɪˌnɪʃɪ'eɪʃn] *n* 1. təsis etmə, özülünü / əsasını qoyma; **the ~ of an enterprise** müəssisə təsis etmə; 2. qəbul etmə *(cəmiyyətə, vəzifəyə, kluba və s.)*; **~ into a society** cəmiyyətə qəbul etmə

**initiative** [ɪ'nɪʃɪətɪv] *n* 1. təşəbbüs; **to do** ***smth.*** **on** ***one's*** **own ~** bir şeyi öz təşəbbüsü ilə etmək; **to take the ~ in doing** ***smth.*** bir şeyi etməkdə təşəbbüsü öz əlinə almaq; **a United Nations peace ~** Birləşmiş Millətlər Təşkilatının sülh təşəbbüsü; 2. zirəklik, diribaşlıq, hazırcavablıq, fərasət, bacarıq; **to show ~** zirəklik / diribaşlıq göstərmək

**initiator** [ɪ'nɪʃɪeɪtəʳ] *n* təşəbbüsçü, təşəbbüskar, təşəbbüs göstərən; **the ~ of the project** layihənin təşəbbüskarı

**initiatory** [ɪ'nɪʃɪətərɪ] *adj* birinci, başlanğıc, erkən, giriş; **the ~ step** birinci addım; **~ stage** erkən mərhələ

**inject** [ɪn'dʒekt] *v* yeritmək, vurmaq *(iynə)*; **to ~ a drug into the body** bədənə dərman yeritmək/vurmaq; **to ~ oneself with insulin** özünə insulin vurmaq; **to ~ penicillin into** ***smb.*** bir kəsə penisillin vurmaq; **to ~ penicillin into** ***smb.'s*** **arm** bir kəsin qoluna penisillin vurmaq

**injection** [ɪn'dʒekʃn] *n* inyeksiya *(iynə vurma, dəri altına iynə ilə dərman yeritmə)*; yeritmə; **to give a medicine/a drug by ~** inyeksiya vasitəsilə dərman yeritmək/ vurmaq; *I hate having injection Mənim iynə vurdurmaqdan zəhləm gedir*

**injudicious** [ˌɪndʒu'dɪʃəs] *adj* ağılsız, düşüncəsiz; yersiz, münasibətsiz; **~ remarks** yersiz məzəmmətlər/mülahizələr; **~ actions** ağılsız /düşüncəsiz/yersiz hərəkətlər

**injunction** [ɪn'dʒʌŋkʃn] *n* 1əmr, əmrnamə, əmr etmə, sərəncam, göstəriş; hökm, fərman; **the high ~** yüksək sərəncam; **to obey the ~s** əmrlərə/fərmanlara/sərəncamlara/göstərişlərə əməl etmək; 2. *hüq.* məhkəmə qadağası

**injure** ['ɪndʒəʳ] *v* 1. əzmək, zədələmək, yaralamaq; **to ~** ***one's*** **knee/leg with** ***smth.*** bir şeylə dizini/qıçını əzmək/zədələmək/yaralamaq; **to ~ oneself** zədələnmək / əzilmək; *He fell off his bicycle and injured himself O velosipedindən yıxıldı və zədələndi / yaralandı;* **to be ~d in an accident** qəzada zədələnmək/yaralanmaq; *She was slightly / seriously / badly injured in a road accident O, yol qəzasında yüngülcə / ciddi / ağır zədələndi;* 2. əziyyət vermək, yara vurmaq, incitmək, xətirə dəymək, könül sındırmaq; toxunmaq; **to ~** ***smb.'s*** **feelings** bir kəsin heysiyyatına toxunmaq; *I hope I didn't injure your feelings Ümid edirəm ki, mən sənin /sizin heysiyyatına/heysiyyatınıza toxunmadım;* 3. xarab etmək, ziyan vurmaq / vermək; korlamaq; **to ~** ***smb.'s*** **health** bir kəsin sağlamlığını/səhhətini korlamaq; **to ~** ***one's*** **reputation** öz şərəfini/adını korlamaq; **to ~** ***smb.'s*** **reputation** bir kəsin adını /şöhrətini korlamaq; *Such malicious gossips could seriously injure her reputation Belə qərəzli dedi-qodular onun şərəfini / adını ciddi surətdə korlaya bilərdi*

**injured** ['ɪndʒəd] *adj* 1. əzilmiş, yaralanmış, xarab edilmiş, korlanmış; **crops ~ by hail** doludan korlanmış/məhv olmuş məhsul; **an ~ look** incik baxış; **an ~ voice** incik səs; **~ pride** təhqir olunmuş / alçaldılmış vüqar; **the ~** *top.i* yaralılar, zədə almışlar, zədələlər; *Ambulances took the injured to hospital Təcili yardım maşınları yaralıları xəstəxanaya apardı*

**injurious** [ɪn'dʒuərɪəs] *adj* ziyanlı, zərərli, xatalı, xətərli, öldürücü, məhvedici, tələfedici, zərərverən; **~ to health** sağlamlıq üçün ziyanlı/zərərli; *Smoking is injurious to health Siqaret çəkmək sağlamlıq üçün ziyanlıdır / zərərlidir*

**injury** ['ɪndʒərɪ] *n* 1. bədən xəsarəti, əzik, yara; **to inflict injuries on** ***smb.*** bir kəsə bədən xəsarəti yetirmək; **to receive an ~** bədən xəsarəti almaq, əzilmək; **to sustain injuries** əlil/şikəst olmaq; 2. zərər, ziyan, itki; **to be an ~ to** ***smth.*** bir şeyə ziyan / zərər vermək; **to do** ***smb.*** **an ~** bir kəsə zərər / ziyan vermək; **to compensate for an ~** ziyanı/zərəri / itkini ödəmək; **~ by fire** yanğının verdiyi ziyan; **~ by/from collision** toqquşma nəticəsində itki / ziyan; **to do** ***smth.*** **to** ***one's*** **own ~** özünə ziyan / zərər vurmaq

**injustice** [ɪn'dʒʌstɪs] *n* ədalətsizlik, insafsızlıq, haqsızlıq; **to do** ***smb.*** **an ~** bir kəsə qarşı ədalətsizlik etmək; **victim of ~** ədalətsizliyin / haqsızlığın qurbanı

**ink**[1] [ɪŋk] *n* mürəkkəb; **to write in ~** mürəkkəblə yazmaq;

◊ **as black as ~** ≅ qətran kimi qara

**ink[2]** [ɪŋk] *v* **1.** mürəkkəblə nişanlamaq / nişan qoymaq, mürəkkəblə haşiyələmək / haşiyə çəkmək; **2.** mürəkkəblə çirkləndirmək / ləkələmək; **to ~ *one's* fingers** barmaqlarını mürəkkəblə bulamaq/ləkələmək

**ink-well** [ˈɪŋkwel] *n* mürəkkəb qabı

**inky** [ˈɪŋkɪ] *adj* mürəkkəbli, mürəkkəbə batmış; **~ fingers** mürəkkəbli/mürəkkəbə batmış barmaqlar

**inland[1]** [ˈɪnlənd] *n (əsasən pl)* dənizdən və ya sərhəddən uzaq ərazi; **to reach the ~s** ölkənin dərinliyinə daxil olmaq

**inland[2]** [ˈɪnlənd] *adj* **1.** ölkədaxili; ölkənin içərilərində yerləşən, dənizdən və ya sərhəddən uzaq; **~ town** ölkədaxili şəhər, ölkənin içərilərində yerləşən şəhər; **2.** daxili *(ticarət və s. haq.)*; **~ trade** daxili ticarət; **~ navigation** ölkədaxili su yolları ilə üzmə

**inland[3]** [ɪnˈlænd] *adv* **1.** içinə, içərilərinə, içərilərə; **to go ~** ölkənin içərilərinə getmək; **2.** ölkənin içərilərində; **to live ~** dənizdən və ya sərhəddən uzaq rayonda / ölkənin içərilərində yaşamaq

**in-law** [ˈɪnlɔ:] *n (adət. pl) d.d.* ər və ya arvad tərəfdən qohumlar, ər qohumları, arvad qohumları

**inlay[1]** [ˈɪnleɪ] *n* **1.** inkrustasiya, qaxma *(başqa bir material üzərinə qaxılan sədəf, sümük, qiymətli daş və s.-dən ibarət bəzək)*; **2.** *tib.* plomb *(çürük dişə doldurulan maddə)*; **3.** mozaik iş; parket döşəmə

**inlay[2]** [ˈɪnˈleɪ] *v (pt, pp* **inlaid** [ˈɪnˈleɪd]) **1.** mozaik iş görmək; mozaika ilə örtmək; **to ~ a floor** döşəməyə bəzəkli parket vurmaq; **2.** qaxma işi görmək

**inlet[1]** [ˈɪnlet] *n* nazik dəniz körfəzi; fiord *(qayalı sahilləri olan dar və girintili-çıxıntılı körfəz)*, çox böyük olmayan buxta *(kiçik körfəz)*

**inlet[2]** [ɪnˈlet] *v* salmaq, taxmaq; yerləşdirmək; **to ~ a ruby** yaqut salmaq / taxmaq *(üzüyə və s.)*

**inmate** [ˈɪnmeɪt] *n* sakin, yaşayan *(xüs. həbsxanada, monastırda və s.-də)*; **the ~s of a hospital** xəstəxanada olan xəstələr

**inmost** [ˈɪnmoust] *adj* **1.** ən dərin; ən uzaq; **the ~ centre of the earth** yerin ən dərin mərkəzində; **2.** ən gizli/ məxfi, gizli saxlanan/tutulan; ən məhrəm; **her ~ desire** onun ən məhrəm arzusu; **~ feelings / thoughts** ən gizli hisslər / fikirlər; *This book reveals her inmost secrets Bu kitab onun ən gizli sirlərini açır/aşkar edir*

**inn** [ɪn] *n* mehmanxana; karvansara; aşxanalı mehmanxana *(keçmişdə)*; **a wayside ~** yolkənarı mehmanxana; **to be at an ~** mehmanxanada qalmaq; **to put up/to stop at an ~** mehmanxanaya düşmək; **an old country ~** köhnə kənd mehmanxanası

**innards** [ˈɪnədz] *n pl* daxili hissələr/orqanlar, içalat; **turkey ~** hinduşka içalatı

**innate** [ˌɪˈneɪt] *adj* anadangəlmə, fitri, təbii; **~ politeness** anadangəlmə nəzakət; **~ talent** anadangəlmə/fitri istedad; **~ eloquence** təbii nitq qabiliyyəti; **~ beauty** təbii gözəllik; **~ ability** anadangəlmə qabiliyyət

**innately** [ɪˈneɪtlɪ] *adv* təbii olaraq, təbiətən; **~ dishonest** təbiətən şərəfsiz / fırıldaqçı / dələduz

**inner** [ˈɪnəʳ] *adj* **1.** iç, daxili; **~ door/room** iç/içəri qapı / otaq; **~ voice** vicdan, insaf; **the ~ circles** az-çox nüfuzlu /mötəbər hakim dairələr; **2.** gizli, intim; **~ thoughts** gizli fikirlər; **~ life** intim həyat; **~ conflict** gizli münaqişə

**innkeeper** [ˈɪnˌki:pəʳ] *n* mehmanxana sahibi; aşxana sahibi

**innocence** [ˈɪnəsns] *n* **1.** günahsızlıq, təqsirsizlik, qəbahətsizlik; məsumluq; **to maintain *one's* ~** günahsızlığını sübut etmək; **to prove *one's* ~ of a crime** özünün cinayətdə əli olmadığını sübut etmək; **2.** sadədillik, sadəlövhlük, ürəyiaçıqlıq, sadəlik; **to smile in ~** sadəlövhcəsinə gülümsəmək; **3.** zərərsizlik, ziyansızlıq; **~ of treatment** müalicənin zərərsizliyi / ziyansızlığı

**innocent[1]** [ˈɪnəsnt] *n* **1.** günahsız / məsum körpə; **2.** sadədil / sadəlövh adam

**innocent[2]** [ˈɪnəsnt] *adj* **1.** günahsız, taqsırsız, qəbahətsiz; məsum; təmiz; **~ babe** məsum körpə; **~ life** təmiz/namuslu həyat; **to hold *smb.* ~** bir kəsi günahsız hesab etmək; **to be ~ of the crime** cinayətdə əli olmamaq; **2.** sadə, sadədil, sadəlövh, ürəyiaçıq, hiyləsiz; **~ girl** sadədil / sadəlövh qız; **an ~ man** sadəlövh adam; *Don't be so innocent as to believe everything the politicians tell you Belə sadəlövh olma/olmayın; Siyasətçilərin hər dediyi şeyə inanma/inanmayın*; **3.** zərərsiz, ziyansız; **~ game** zərərsiz oyun; **~ tattling** zərərsiz/ziyansız cəfəngiyyat/boşboğazlıq; **~ medicine** ziyansız/zərərsiz dərman; **4.** *tib.* salamat, qorxusuz, xoşxasiyyət *(şiş və s.)*

**innocently** [ˈɪnəsntlɪ] *adv* günahsız yerə / olaraq, nahaq yerə, məsumanə, sadəlövhcəsinə, sadəlövhlüklə, sadədilliklə

**innocuous** [ɪˈnɔkjuəs] *adj* **1.** zərərsiz, ziyansız, xatasız, xətərsiz; **~ snake** xətərsiz ilan *(yəni zəhəri olmayan)*; **an ~ remark** zərərsiz məzəmmət / töhmət; **2.** ziyanlı təsiri olmayan

**innovate** [ˈɪnəveɪt] *v* yenilik tətbiq etmək, yenilik gətirmək *(yeni metod, fikir və s. haq.)*

**innovation** [ˌɪnəˈveɪʃn] *n* **1.** yenilik; **an ~ in technology** texnologiyada yenilik; **2.** yenilik tətbiq etmə; **a period of ~** yenilik tətbiqi dövrü

**innovator** [ˈɪnəˈveɪtəʳ] *n* novator, yenilikçi, yenilik gətirən, yenilik tətbiq edən

**innuendo** [ˌɪnjuˈendou] *n (pl* **-os**, *və ya* **-oes** [-ouz]) **1.** xəlvəti eyham/him; **to convey *smth.* by ~** bir şey haqqında dolayı eyhamla danışmaq, bir şeyə eyham vurmaq; **2.** böhtan, iftira; hücum, düşməncəsinə çıxış; **evil ~es** çirkin/iyrənc/mənfur böhtan / iftiralar; **wrathful ~es against *smb.*** bir kəsə qarşı kəskin hücum

**innumerable** [ɪˈnju:mərəbl] *adj* hədsiz, qədərsiz, saysız-hesabsız, son dərəcə çox, saya-hesaba gəlməyən; **~ number** qədərsiz/son dərəcə çox miqdar; **~ army** saya-hesaba gəlməyən/ son dərəcə çox saylı ordu; **~ books** son dərəcə çox sayda kitablar; **~ opportunities** saysız-hesabsız imkanlar

**inobservant** [ˌɪnəbˈzə:vənt] *adj* **1.** diqqətsiz, etinasız, saymaz; **~ spectators** diqqətsiz/etinasız tamaşaçılar; **2.** yerinə yetirməyən, riayət etməyən *(göstərişi, sərəncamı və s.)*; **~ of the law** qanuna riayət etməyən, qanunu yerinə yetirməyən

**inoculate** [ɪˈnɔkjuleɪt] *v* **1.** peyvənd etmək *(müəyyən xəstəliyə qarşı)*; **to ~ *smb.* against cholera** bir kəsə vəbaya qarşı peyvənd etmək; *He was inoculated with the smallpox serum Ona çiçək peyvəndi etdilər*; **2.** *məc.* salmaq *(qorxu və s.)*; yaymaq, təlqin etmək; oyatmaq, yaratmaq; **3.** *k.t.* calaq etmək / vurmaq

**inoculation** [ˌɪnɔkjuˈleɪʃn] *n* **1.** *tib.* peyvənd; **2.** *məc.* yeritmə, geniş yayma *(fikri, ideyanı və s.)*; **3.** *k.t.* calama, calaq vurma, aşı

**inoculative** [ɪˈnɔkjulətɪv] *adj* peyvənd; **~ material** aşı / calaq maddəsi

**inoffensive** [ˌɪnəˈfensɪv] *adj* zərərsiz, ziyansız; üzüyola, dinc, sakit; **an ~ person** üzüyola/yumşaqxasiyyətli adam; **~ medicine** zərərsiz / ziyansız dərman

**inoperable** [ɪnˈɔprəbl] *adj* **1.** *tib.* müalicəsiz, müalicəsi olmayan; **~ case** müalicəsi olmayan xəstəlik; **2.** tətbiq edilə bilməyən, yararsız, yaramaz, gərəksiz

**inoperative** [ɪnˈɔpərətɪv] *adj* təsir göstərməyən, təsirli / təsiri olmayan, təsirsiz; etibarsız, qanuni qüvvəsi olmayan

**inopportune** [ɪnˈɔpətju:n] *adj* vaxtsız, vədəsiz, yersiz; əlverməyən, əlverişli / münasib olmayan, yaramayan; **~ visit** əlverişsiz / münasib olmayan / yersiz vizit; **~ demands** yersiz tələblər; *You arrived at an inopportune moment Sən /Siz əlverişsiz anda gəlib çıxdın / çıxdınız*

**inordinate** [ɪnˈɔ:dɪnət] *adj* **1.** nizamsız, qarışıq, qarma-qarışıq, dağınıq, səliqəsiz; **~ heap** qarma-qarışıq topa/qalaq/yığın; **2.** həddən artıq / çox, hədsiz; **an ~ amount of money** həddən çox məbləğdə pul; **an ~ amount of time** həddən artıq/ çox vaxt; **~ cost** həddən artıq yüksək qiymət; **~ pride** hədsiz lovğalıq/məğrurluq/təkəbbür/dikbaşlıq; **~ drinking** həddindən artıq spirtli içki içmə

**inorganic** [ˌɪnɔ:ˈgænɪk] *adj* qeyri-üzvi; cansız; **~ chemistry** qeyri-üzvi kimya; **~ nature** cansız təbiət; **~ substances** cansız cisimlər/maddələr; **~ fertilizer** qeyri-üzvi gübrə; *Rocks and minerals are inorganic Qayalar və minerallar cansızdır*

**in-patient** [ˈɪnˌpeɪʃnt] *n* **1.** stasionar xəstə *(xəstəxanada müalicə edilən xəstə)*; **2.** *d.d.* yatan xəstə



**input[1]** [ˈɪnput] *n* **1.** içəri qoyma, əlavə etmə; **the ~ of additional resources into the scheme** plana əlavə vəsait qoyma; **2.** kompyuterə informasiya daxil etmə

**input[2]** [ˈɪnput] *v (pt* **input**; *pp* **inputted**) informasiyanı/məlumatı kompyuterə daxil etmək; **to ~ the monthly sales figures** aylıq satış rəqəmlərini kompyuterə daxil etmək

**inquest** [ˈɪŋkwest] *n* **1.** nəticə; araşdırma, tədqiqat, tədqiq etmə; sorğu-sual, dindirmə, istintaq; **an ~ of lunacy** psixi vəziyyəti müəyyənləşdirmək üçün aparılan ekspertiza *(bir qərara gəlmək üçün məsələnin mütəxəssislər tərəfindən öyrənilməsi)*; **2. a coroner's ~** meyiti / cəsədi müayinə etmə *(istintaq üçün)*;
◊ **great /last/solemn ~** *din.* qiyamət/məhşər günü

**inquire** *(həm də* **enquire**) [ɪnˈkwaɪəʳ] *v* soruşmaq, xəbər almaq; öyrənmək; **to ~ *smb.'s* name** bir kəsin adını soruşmaq; **to ~ the way** yolu soruşmaq; **to ~ the reason** səbəbi öyrənmək; *What's your profession? she inquired Sənin / Sizin sənətin / sənətiniz nədir? deyə o, soruşdu*

**inquirer** *(həm də* **enquirer**) [ɪnˈkwaɪərəʳ] *n* soruşan, sorğu-sual aparan

**inquiring** *(həm də* **enquiring**) [ɪnˈk waɪərɪŋ] *adj* **1.** sualedici, sualverici; yalvarıcı; **~ look** sualedici/yalvarıcı baxış; **2.** hər şeylə maraqlanan, hər şeyi bilmək istəyən; **an ~ mind** hər şeyi bilmək istəyən zəka

**inquiringly** *(həm də* **enquiringly**) [ɪnˈk waɪərɪŋlɪ] *adv* sualedici/yalvarıcı bir tərzdə; **to look at *smb.* ~** bir kəsə sualedici / yalvarıcı tərzdə baxmaq

**inquiry** [ɪnˈkwaɪərɪ] *n* **1.** məlumat toplama, soraq alma; sorğu-sual etmə, soruşub öyrənmə; xəbər vermə, xəbərdar etmə, məlumat vermə; **2.** sual, sorğu; **reasonable ~** ağıllı sual; **a letter of ~** yazılı sorğu; **to make inquiries about *smb./smth.*** bir kəs /şey haqqında sorğu aparmaq; **to reply to inquiries** sorğulara cavab vermək; **3.** *hüq.* istintaq; **to renew the ~** istintaqa yenidən başlamaq; **to make a searching ~** əsaslı/mükəmməl istintaq aparmaq; **to reject *smth.* without ~** bir şeyi nəzərdən keçirmədən rədd etmək; **4.** tədqiqat; **chemical inquiries** kimyəvi tədqiqatlar; **the scientific method of ~** tədqiqatın elmi metodu; **to subject *smth.* to ~** bir şeyi tədqiq etmək

**inquisition** [ˌɪnkwɪˈzɪʃn] *n* **1.** araşdırma, öyrənmə, tədqiq etmə; tədqiqat; **earnest ~** ciddi tədqiqat; **to search by ~** tədqiqat aparmaq; **2.** *hüq.* istintaq, istintaq aparma; **to set on foot a careful ~** mükəmməl istintaqa başlamaq; **3.** (**the Inquisition**) *tar. (ancaq təkdə işlənir)* inkvizisiya *(öz düşmənləri ilə vəhşi və amansız üsullarla mübarizə etmək üçün XV əsrdən XVIII əsrə qədər fəaliyyət göstərən məhkəmə-polis təşkilatı)*; **4.** *məc.* işkəncə, əzab

**inquisitive[1]** [ɪn'kwɪzɪtɪv] *n* hər şeylə maraqlanan / hər şeyi bilmək istəyən adam
**inquisitive[2]** [ɪn'kwɪzɪtɪv] *adj* hər şeylə maraqlanan, hər şeyi bilmək istəyən; **a very ~ child** çox dəcəl / hər şeylə maraqlanan uşaq
**inquisitively** [ɪn'kwɪzɪtɪvlɪ] *adv* maraqla, həvəslə; ciddiyyətlə, cidd-cəhdlə
**inquisitiveness** [ɪn'kwɪzɪtɪvnɪs] *n* hər şeylə maraqlanma, hər şeyi bilmək istəyi, biliyə həvəs/maraq göstərmə, hər şeyi bilmək / öyrənmək həvəsi
**inquisitor** [ɪn'kwɪzɪtə'] *n* **1.** tədqiqatçı; **2.** *hüq.* məhkəmə müstəntiqi; **3.** *tar.* inkvizitor *(inkvizisiya məhkəməsinin üzvü)*
**inroad** ['ɪnroud] *n* **1.** basqın, qəfil hücum, yürüş, soxulma; **plundering ~s** soyğunçuluq/quldurluq basqınları; **to make an ~ into/upon a country** ölkəyə basqın/yürüş / hücum etmək; **the ~s of the sea** dənizin quruya soxulması; **2.** *(əsas. pl)* qəsd, qəsd etmə, əl uzatma; **~s upon *smb.'s* time** bir kəsin vaxtını alma; **~s upon *smb.'s* savings** bir kəsin qənaət edib yığdığı pula əl uzatma; **3.** hücum *(ziyanvericilər tərəfindən)*; basqın *(gəmiricilər tərəfindən)*
**inrush** ['ɪnrʌʃ] *n (adət. sing.)* **1.** qəfil basqın/hücum / yürüş **2.** qəfil axın *(su haq.)*; **the ~ of the flood** selin gözlənilmədən qalxması; **an ~ of tourists** turistlərin axını; **3.** qəfil uçma / uçqun / çökmə
**insane** [ɪn'seɪn] *adj* **1.** ruhi xəstə, divanə, dəli; ağılsız, anormal; **~ person** anormal / dəli adam; *He went insane O, ağlını itirdi /dəli oldu*; **to drive *smb.* ~** bir kəsi dəli etmək; *This job will drive me insane Bu iş məni dəli edəcək*; **2.** axmaq, sarsaq; cəfəng, mənasız; **~ desire** axmaq arzu; **~ idea** cəfəng ideya/fikir; **~ attempt** mənasız cəhd; **~ plan** mənasız plan; **~ decision** mənasız qərar; **the ~** *top.i* ruhi xəstələr, dəlilər; **a hospital for the ~** dəlixana, ruhi xəstələr üçün xəstəxana
**insanely** [ɪn'seɪnlɪ] *adv* dəlicəsinə, dəli kimi; **~ jealous** dəlicəsinə qısqanc
**insanitary** [ɪn'sænɪtrɪ] *adj* çirkli, natəmiz, səhiyyə tələblərinə cavab verməyən, antisanitariya; **~ conditions** antisanitariya vəziyyəti; **~ living conditions** natəmiz / antisanitar yaşayış şəraiti
**insanitation** [ɪn,sænɪ'teɪʃn] *n* çirkli/natəmiz vəziyyət, antisanitariya
**insanity** [ɪn'sænɪtɪ] *n* ruhi xəstəlik, ağılsızlıq; dəlilik; **the ~ of going out in the rain** yağışda çölə/bayıra çıxmağın ağılsızlığı; **signs of ~** dəliliyin əlamətləri/ nişanələri
**insatiability** [ɪn,seɪʃjə'bɪlɪtɪ] *n* acgözlük, gözüdoymazlıq, doymazlıq, tamahkarlıq, hərislik
**insatiable** [ɪn'seɪʃəbl] *adj* acgöz, doymaz, doymaq bilməyən, tamahkar, həris; söndürülməz; sönməz; **~ appetites** doymaq bilməyən iştahalar; **an ~ desire** sönməz arzu; **an ~ thirst** sönməz susuzluq/yanqı
**insatiably** [ɪn'seɪʃəblɪ] *adv* acgözlüklə, acgözcəsinə; tamahkarcasına, tamahkarlıqla
**inscribe** [ɪn'skraɪb] *v* **1. (in, on)** üstünə/üstündə yazmaq; **to ~ *one's* name in a book** adını kitabın üstünə yazmaq *(bir kəsə ithaf edəndə və ya bağışlayanda)*; **to ~ verses on a tomb-stone** başdaşının üstünə şer yazmaq; **2.** yazmaq, daxil etmək *(siyahıya)*, qeydə almaq; **3.** həkk etmək; **to ~ a fact/a verse on *one's* memory** faktı / şeri yaddaşına həkk etmək; **to ~ *one's* name among the immortals** adını əbədiləşdirmək; **4. (to)** həsr etmək; **to ~ a poem/a book to *smb.*** bir kəsə şer / kitab həsr etmək
**inscription** [ɪn'skrɪpʃn] *n* yazı; kitabə *(daş, metal, ağac və s. üzərində yazılmış qədim yazı)*; **runic ~** runa yazısı/kitabəsi; **an illegible ~** çətinoxunan yazı / kitabə; *There is an illegible inscription on the tomb Qəbirdaşının üstünə həkkedilmiş çətinoxunan bir yazı var*
**inscrutability** [ɪn,skru:tə'bɪlɪtɪ] *n* anlaşılmazlıq, dərkedilməzlik, ağlasığmazlıq; sirr
**inscrutable** [ɪn'skru:təbl] *adj* anlaşılmaz, ağılçatmaz, dərkedilməz, ağlasığmaz; sirli, gizli; **~ facts** anlaşılmaz faktlar; **~ smile** sirli təbəssüm; **~ mystery** anlaşılmaz/dərkedilməz sirr; **~ gaze** anlaşılmaz / sirli baxış; *I find his poetry rather inscrutable Onun poeziyası mənim üçün bir qədər anlaşılmazdır*
**inscrutably** [ɪn'skru:təblɪ] *adv* anlaşılmaz / ağlabatmaz / sirrli bir tərzdə, müəmmalı, müəmmalı bir tərzdə
**insect** ['ɪnsekt] *n* **1.** həşərat, cücü; **a swarm of ~s** həşərat sürüsü/yığını; *Butterflies, ants, bees and flies are insects Kəpənəklər, qarışqalar, arılar və milçəklər həşəratdır*; **2.** *məc.* heç bir rolu/təsiri / nüfuzu olmayan adam
**insecticide** [ɪn'sektɪsaɪd] *n* həşərat qırmaq üçün vasitə / dərman
**insectivore** [ɪn'sektɪvɔ:] *n* həşəratyeyən *(heyvan və ya bitki)*
**insectivorous** [,ɪnsek'tɪvərəs] *adj* həşəratyeyən *(heyvan və ya bitki)*
**insect-powder** ['ɪnsekt,paudə'] *n* dust *(toz halında dezinfeksiya maddəsi)*
**insecure** [,ɪnsɪ'kjuə] *adj* **1.** təhlükəli, qorxulu, xatalı, xətərli; **~ position** təhlükəli vəziyyət; **2.** etibarsız; şübhəli; davamsız, təzsınan; **~ ladder** davamsız nərdivan; **~ lock** etibarsız qıfıl; **~ footing/hold** etibarsız / davamsız dayaq; **3.** zəif; **~ hope** zəif ümid
**insecurity** [,ɪnsɪ'kjuərɪtɪ] *n* təhlükəlilik, xatalılıq, xətərlilik, qorxululuq
**inseminate** [ɪn'semɪneɪt] *v* mayalandırmaq, döllændirmək; **to ~ a cow** inəyi mayalandırmaq
**insemination** [ɪn,semɪ'neɪʃn] *n* mayalama, mayalandırma, dölləndirmə; **artificial ~** süni mayalandırma / dölləndirmə
**insensibility** [ɪn,sensə'bɪlɪtɪ] *n* **1.** hissizlik, duyğusuzluq, hiss etməmə, duymama; **~ to pain/cold** ağrını/soyuğu hiss etməmə; **2.** huşsuzluq, huşsuz vəziyyət; **in a state of ~** huşsuz vəziyyətdə; **3.** laqeydlik, etinasızlıq; həvəssizlik; **~ to beauty/to art/ to music, *etc.*** gözəlliyə/incəsənətə / musiqiyə *və s.* qarşı laqeydlik/etinasızlıq; **~ to human suffering** insan dərdinə/ əzabına laqeydlik / etinasızlıq
**insensible** [ɪn'sensəbl] *adj* **1.** hissiz, duyğusuz, qeyri-həssas; hiss etməyən; **~ to pain / to cold, *etc.*** ağrını / soyuğu və s. hiss etməyən; **2.** fərqləndirə bilməyən; **~ to colours** rəngləri fərqləndirə bilməyən; **3.** hissini itirmiş, huşsuz; **to be ~ from pain** ağrıdan huşunu itirmək; **to fall (down) ~** huşsuz vəziyyətdə yıxılmaq; **4.** laqeyd, etinasız; hiss etməyən, anlamayan; **~ of the danger** təhlükənin ciddiliyini anlamayan; **~ to fear** qorxmaz, qorxubilməz; *He seemed insensible to the need of his children O, elə bil ki, uşaqlarının ehtiyacını görmürdü*; **5.** hiss olunmayan/edilməyən; **~ change** hiss olunmayan / edilməyən dəyişiklik
**insensibly** [ɪn'sensəblɪ] *adv* **1.** hissiz halda, hissiz olaraq, bihuş halda; **2.** laqeydcəsinə, etinasızcasına, laqeyd/etinasız bir tərzdə
**insensitive** [ɪn'sensətɪv] *adj* **1.** qeyri-həssas, həssas olmayan; **~ to light** işığa qarşı qeyri-həssas; **~ to pain / to cold** ağrıya / soyuğa qarşı qeyri-həssas; **2.** naqabil, qabiliyyətsiz, korazehin, laqeyd, etinasız; **~ to beauty** gözəlliyə etinasız; *She's completely insensitive to other people's feelings O, başqa adamların hisslərinə tamamilə laqeyddir*
**insentient** [ɪn'senʃnt] *adj* cansız; **~ substance** cansız materiya
**inseparability** [ɪn'seprəbɪlɪtɪ] *n* ayrılmazlıq, qoparılmazlıq; bütövlük; **~ of art and life** incəsənətin və həyatın ayrılmazlığı
**inseparable** [ɪn'sepərəbl] *adj* ayrılmaz, aralanmaz, ayrılması mümkün olmayan; qırılmaz, möhkəm; **~ union** möhkəm / qırılmaz ittifaq; **~ friends** ayrılmaz dostlar; *The two friends were inseparable - they went everywhere together Bu iki dost ayrılmaz idilər; onlar hər yerə birgə gedirdilər*
**inseparably** [ɪn'seprəblɪ] *adv* qırılmaz / ayrılmaz surətdə, möhkəm
**insert[1]** ['ɪnsə:t] *n* **1.** əlavə, əlavə vərəq, qoşma *(xüs. kitaba, qəzetə)*; **an eight-page ~** səkkiz səhifəlik əlavə; **2.** *tex.* içlik *(maşının içərisinə və ya altına qoyulan metal, plastik və ya taxta parçası)*; ara /aralıq qat; vtulka, oymaq *(çarxların içərisində sürtünməni azaltmaq üçün metal borucuq və halqa)*
**insert[2]** [ɪn'sə:t] *v* **1.** əlavə etmək; **to ~ a letter into a word** sözə hərf əlavə etmək; **to ~ a new paragraph in a book** kitaba yeni paraqraf əlavə etmək; **2.** salmaq; **to ~ a key in a lock** qıfıla açar salmaq; **to ~ a coin in a slot-machine** avtomata pul salmaq; **3.** yeritmək; **to ~ vaccine matter** vaksin yeritmək *(bədənə)*
**insertion** [ɪn'sə:ʃn] *n* **1.** əlavə etmə; **2.** orbitə çıxartma *(kosmik gəmini)*; **3.** yerləşdirmə *(məqalə və s. qəzetdə və s.)*; **3.** elan *(qəzetdə və s.)*; **4.** atma, salma; **the ~ of a coin into a slot-machine** avtomata pul *(dəmir pul)* salma
**inset[1]** ['ɪnset] *n* **1.** əlavə vərəq *(qəzetdə və ya kitabda)*; içəri yapışdırılmış vərəq və s. *(kitabda və s.)*; **2.** axın, axıb gəlmə
**inset[2]** ['ɪn'set] *v (-tt-; pt, pp* **inset)** salmaq, taxmaq; yerləşdirmək, qoymaq
**inside[1]** ['ɪn'saɪd] *n* **1.** daxili məkan/hissə; **the ~ of a room** otağın daxili; *Have you seen the inside of the house? Sən /Siz evin içərisini görmüsənmi?/görmüsünüzmü?*; **2.** astar, astar tərəf, tərs üz; **the ~ of a hat** şlyapanın astarı / tərs üzü; **3.** *pl* içalat; **the ~s of a fowl** quşun içalatı; **4.** *d.d.* daxili aləm, iç üz, təbiət; ruh; gizli / gizli saxlanılan fikir; **to have a good ~** yaxşı insan olmaq; **to feel *smth.* with *one's* ~** bir şeyi daxilən hiss etmək; **5.** *d.d.* orta, ortası; **the ~ of a week** həftənin ortası; **6.** *amer. d.d.* gizli məlumat / informasiya; **7.** *id.* yarım hücumçu; **~ left / right** sol / sağ yarım hücumçu
**inside[2]** [,ɪn'saɪd] *adj* **1.** qoltuq; daxili, iç; **~ pocket** qoltuq cibi; *He keeps his wallet in an inside pocket O, bumajnikini/portmanatını qoltuq cibinə qoyur*; **the ~ pages of a newspaper** qəzetin səhifələri; **~ dimension** *tex.* daxili ölçü; **2.** *amer. d.d.* gizli, örtülü; **~ man 1)** müəssisənin gizli agenti; **2)** öz adamı
**inside[3]** [,ɪn'saɪd] *adv* **1.** içəri, içəridə; *The children are playing inside because it's cold Uşaqlar içəridə oynayırlar, çünki soyuqdur*; **to look ~** içinə baxmaq; *He opened the box and looked inside O, qutunu açdı və içinə baxdı*; *The guests had to move inside when it started to rain Yağış yağmağa başlayanda qonaqlar içəri keçməyə məcbur oldular*; **2.** *məc.* daxilən; *I was angry inside but pretended not to care Mən daxilən acıqlı idim, lakin özümü o yerə qoymadım*; **~ of** *amer. d.d.* müddətində, ərzində; **~ of an hour** bir saat müddətində / ərzində
**inside[4]** [,ɪn'saɪd] *prep* ...içinə, ...içərisinə, ...daxilinə; ...içində, ...içərisində, ...daxilində; **~ the room** otağın içərisində; **to go ~ the house** evin içərisinə getmək; *Put the bird inside the cage Quşu qəfəsin içərisinə/içinə qoy/qoyun; Inside the box was a gold watch Qutunun içində/içərisində (bir) qızıl saat vardı*
**inside out** ['ɪn'saɪdaut] *adv* tərsinə, tərs üzünə; **to turn *smth.* ~** bir şeyi tərs üzünə çevirmək; **to put *smth.* on ~** bir şeyi tərsinə geymək; *He put his socks on inside out O, corablarını tərsinə geyindi*

**insider** [ɪn'saɪdə^r] *n d.d.* **1.** özününkü, özümkü, özümkülər, yaxın adam, qrupun/ təşkilatın üzvü; **2.** məlumatlı/bilikli adam

**insidious** [ɪn'sɪdɪəs] *adj* **1.** bic, hiyləgər, məkrli; xain, xəyanətkar; vəfasız, namərd, əhdi pozan, xəyanətkar, satqın; ~ **foe / enemy** xain / xəyanətkar düşmən; ~ **smile** bic / məkrli / hiyləgər təbəssüm; **2.** gözəgörünməyən, gizli, xətərli; ~ **disease** gizli xəstəlik; **the ~ growth of decay** çürümənin gizli inkişafı

**insidiously** [ɪn'sɪdɪəslɪ] *adv* hiyləgərcəsinə, bic/məkrli bir surətdə, namərdcəsinə, satqıncasına

**insidiousness** [ɪn'sɪdɪəsnɪs] *n* biclik, hiyləgərlik, məkrlilik; xəyanətkarlıq, vəfasızlıq, satqınlıq

**insight** [ɪn'saɪt] *n* fərasət, bəsirət, ağıllılıq, fərasətlilik, gözüaçıqlıq, açıqgözlülük; **a man of ~** fərasətli / gözüaçıq adam; **to be endowed with ~** ağıllı / fərasətli olmaq; **~ into human character** insan xarakterini dərk etmə bacarığı; **a thorough ~ into** *smth.* bir şeyin tam mahiyyətinə varma; **to have an ~ into secrets** sirri açmaq qabiliyyətinə malik olmaq

**insigna** [ɪn'sɪgnɪə] *n pl lat.* fərqlənmə nişanı *(orden, nişan, tac və s.)*; **the ~ of office** ofisi fərqləndirən nişan; **~ worn on the right sleeve** sağ qolda gəzdirilən nişan *(ordu növünü və s. göstərən)*

**insignificance** [ˌɪnsɪg'nɪfɪkəns] *n* azlıq, cüzilik; əhəmiyyətsizlik, az əhəmiyyətlilik; **the ~ of the problem** problemin əhəmiyyətsizliyi

**insignificant** [ˌɪnsɪg'nɪfɪkənt] *adj* **1.** az, kiçik, balaca, cüzi; əhəmiyyətsiz, əhəmiyyəti az olan, ikinci dərəcəli; **~ loss** cüzi itki; **~ town** balaca/az əhəmiyyətli şəhər; **~ number** az/cüzi miqdar; *An insignificant number of people voted against the new constitution Yeni konstitusiya əleyhinə az adam səs verdi*; **2.** boş, mənasız; məzmunsuz; **~ talk** boş/mənasız danışıq; **~ words/phrases** mənasız sözlər/ifadələr

**insincere** [ˌɪnsɪn'sɪə] *adj* qeyri-səmimi, səmimiyyətsiz, ikiüzlü, riyakar; **~ declaration** qeyri-səmimi bəyanat; **to be ~** ikiüzlü / qeyri-səmimi / riyakar olmaq

**insincerely** [ˌɪnsɪn'sɪəlɪ] *adv* qeyri-səmimi, ikiüzlülüklə; riyakarlıqla, riyakarcasına

**insincerity** [ˌɪnsɪn'serətɪ] *n* ikiüzlülük, riyakarlıq, səmimiyyətsizlik

**insinuate** [ɪn'sɪnjueɪt] *v* **1.** yavaş-yavaş / tədriclə / az-az təlqin etmək; **to ~ one's views/one's ideas** öz baxışlarını/fikirlərini yavaş-yavaş təlqin etmək; **to ~ one's desires** tədriclə öz arzularına çatmaq; **2.** eyham vurmaq, söz atmaq, işarə etmək, eyhamla danışmaq, kölgə salmaq, şübhə doğurmaq; **to ~ that** *smb.* **has acted wrongly** bir kəsin səhv hərəkət etdiyinə eyham vurmaq; *Did you mean to insinuate anything? Sən/Siz nəyəsə eyham vurdun?/vurdunuz?*; **3.** gözə girmək, özünü gözə soxmaq, qılığa girmək; **to ~ oneself into** *smb.'s* **confidence** bir kəsin qılığına girmək/etimadını qazanmaq; **4.** yol tapmaq, soxulmaq; **to ~ into a family** ailəyə yol tapmaq / soxulmaq

**insinuation** [ɪnˌsɪnju'eɪʃn] *n* **1.** him, eyham; himcim, düşməncəsinə çıxış; **to make ~s against** *smb.* bir kəsə qarşı düşməncəsinə çıxış etmək; *He ignored the remarks and insinuations O, iradlara və eyhamlara əhəmiyyət vermədi*; **2.** yaltaqlıq, tülkülük; cəzb etmə / rəğbət doğurma bacarığı

**insipid** [ɪn'sɪpɪd] *adj* **1.** dadsız, ləzzətsiz, şit; **~ food** dadsız / ləzzətsiz yemək; **2.** maraqsız; **~ conversation** maraqsız söhbət; **3.** bayağı; **~ jokes** bayağı zarafatlar

**insipidity** [ˌɪnsɪ'pɪdɪtɪ] *n* **1.** dadsızlıq, ləzzətsizlik, şitlik; **2.** maraqsızlıq, bayağılıq

**insist** [ɪn'sɪst] *v* **1.** **(on)** təkid / israr etmək, sözünün üstündə durmaq; **to ~ on the importance of** *smth.* bir şeyin vacibliyinə təkid etmək; *Don't agree unless he insists Əgər o, israr/təkid etməsə, razılaşma/ razılaşmayın*; **2.** israrla/ təkidlə tələb etmək; nail olmaq, əldə etmək, yetişmək *(məqsədə və s.)*; **to ~ on** *smb.'s* **coming** bir kəsin gəlməsini təkidlə tələb etmək; *I insist that he should go Mən təkid edirəm ki, o, getməlidir / getsin; You must go with us, I insist Mən təkidlə tələb edirəm ki, sən/siz bizimlə getməlisən/getməlisiniz*

**insistence** [ɪn'sɪstəns] *n* **1.** inad, israr, səbat, sözünün üstündə durma; mətanət; **2.** təkid, inadcıllıq, təkidlə tələb etmə

**insistent** [ɪn'sɪstənt] *adj* inadlı, təkidli, israrlı, səbatlı, sözünün üstündə duran, inadcıl; **~ demand** təkidli/inadlı tələb; **~ tone** inadlı / israrlı ton; **to be ~ on doing** *smth.* bir şeyi etməkdə inadlı/israrlı olmaq

**insistantly** [ɪn'sɪstəntlɪ] *adv* inadla, təkidlə, israrla; **to demand ~** təkidlə tələb etmək

**insociable** [ɪn'souʃəbl] *adj* adamayovuşmaz, adamdanqaçan, ünsiyyətsiz

**insole** ['ɪnsoul] *n* içlik *(ayaqqabıda)*

**insolence** ['ɪnsələns] *n* **1.** lovğalıq, təkəbbür, iddia, dikbaşlıq; etinasızlıq/saygısızlıq göstərmə, məhəl qoymama; **2.** həyasızlıq, sırtıqlıq, abırsızlıq; ədəbsizlik, utanmazlıq

**insolent** ['ɪnsələnt] *adj* sırtıq, tərbiyəsiz, utanmaz, kobud, abırsız; **~ child** tərbiyəsiz uşaq; **~ behaviour** kobud / utanmaz davranış

**insolently** ['ɪnsələntlɪ] *adv* həyasız-həyasız, həyasızcasına, sırtıqcasına, sırtıq-sırtıq, utanmazcasına, utanmaz-utanmaz, sırtıq-sırtıq, həyasız-həyasız

**insoluble** [ɪn'sɔljubl] *n* **1.** əriməyən, əriyə bilməyən, həll olunmayan/oluna bilməyən; **~ substance** əriməyən maddə; **~ in water** suda əriməyən / həll olmayan; **2.** həll edilməz, həll



edilə bilməyən; **~ problem** həlledilməz problem; **~ conflict** həlledilməz konflikt/münaqişə; **3.** dərkedilməz; **~ mystery** dərkedilməz sirr

**insolvency** [ɪn'sɔlvənsɪ] *n hüq.* borcunu ödəyə bilməmə, bankrotluq, müflislik, iflas

**insolvent** [ɪn'sɔlvənt] *adj* borcunu ödəyə/ verə bilməyən, müflisləşmiş; **~ debtor** borcunu verə bilməyən, borclu; **to declare oneself ~** özünün müflisləşdiyni etiraf etmək

**insomnia** [ɪn'sɔmnɪə] *n* yuxusuzluq; **to suffer from ~** yuxusuzluqdan əziyyət çəkmək; **~ of exhaustion** yorğunluqdan əmələ gəlmiş yuxusuzluq

**inspect** [ɪn'spekt] *v* **1.** diqqətlə yoxlamaq / müayinə etmək; **to ~ goods/food** əmtəələri/ərzağı diqqətlə yoxlamaq; *The police inspected my passport Polis mənim pasportumu diqqətlə yoxladı*; **2.** təftiş etmək, yoxlamaq; **to ~ a school** məktəbi təftiş etmək/yoxlamaq; **to ~ a factory** fabriki/ zavodu təftiş etmək / yoxlamaq

**inspection** [ɪn'spekʃn] *n* **1.** diqqətlə yoxlama/ müayinə etmə; **medical ~** tibbi müayinə; **house-to-house ~** evbəev yoxlama; **2.** təftiş etmə; **a formal ~ of** *smth.* bir şeyi rəsmi olaraq təftiş etmə; **to hold an ~** təftiş aparmaq / etmək

**inspective** [ɪn'spektɪv] *adj* **1.** diqqətli, müşahidəçi, hər şeyə fikir verən / diqqət yetirən; **2.** yoxlama, təftiş; **~ review** təftiş / yoxlama barədə hesabat

**inspector** [ɪn'spektə^r] *n* inspektor, müfəttiş; revizor *(dəmir yolunda)*; kontroller *(qatarda, tramvayda və s.)*

**inspectorate** [ɪn'spektərət] *n* **1.** inspektor vəzifəsi, inspektorluq; **2.** inspektorlar ştatı

**inspiration** [ˌɪnspə'reɪʃn] *n* **1.** ilham, təb; ruhlanma; ruh yüksəkliyi; **to draw/to get / to drive ~ from** *smth.* bir şeydən ilham almaq; **2.** stimullaşdırma, həvəsləndirmə, şirniklendirmə, şirnikdirmə, sövqləndirmə; **3.** təhrik etmə, təhrikçilik, qızışdırıcılıq; **4.** nəfəs alma/çəkmə; tənəffüs

**inspirational** [ˌɪnspə'reɪʃnl] *adj* **1.** ilham almış, ilhamlanmış, ruhlanmış; **an ~ speaker** şövqə gəlmiş/ruhlanmış natiq; **2.** ilhamverən, ilhamverici; ruhlandırıcı; **~ talks** canlı keçən danışıqlar

**inspirator** ['ɪnspəreɪtə^r] *n* **1.** *tex.* injektor *(buxar qazanına su vurmaq üçün cihaz)*; **2.** *tex.* ejektor *(buxar qüvvəsilə işləyən nasos)*; **3.** respirator *(ağız və nəfəs borularını zəhərli qazlardan və tozdan qoruyan cihaz)*

**inspire** [ɪn'spaɪə^r] *v* **1.** təlqin / təsir etmək; salmaq, oyatmaq, yaratmaq *(fikir, hiss və s.)*; **to ~** *smb.* **with hope** bir kəsdə ümid yaratmaq; **to ~ confidence into** *smb.* bir kəsdə inam yaratmaq; **to ~ terror into** *smb.* bir kəsdə qorxu / vahimə yaratmaq; **2.** ruhlandırmaq, ilham / stimul vermək; **to ~** *smb.* **with new life** bir kəsi yeni həyata ruhlandırmaq; **to ~ the audience** dinləyiciləri ruhlandırmaq; *His success inspired the rest of us to greater efforts Onun müvəffəqiyyəti bizləri daha böyük cəhdlərə ruhlandırdı*; **3.** nəfəs / hava almaq; **the air we ~** nəfəs aldığımız hava

**inspired** [ɪn'spaɪəd] *adj* ruhlanmış; ilham almış; ehtiraslı, coşğun; ilhamlı; **an ~ poet / painter** ilhamlı şair / rəssam

**inspiring** [ɪn'spaɪərɪŋ] *adj* ilhamverici; ilhamverən, ruhlandırıcı; **an ~ teacher** ruhlandırıcı müəllim

**inspirit** [ɪn'spɪrɪt] *v* ruhlandırmaq, ruh vermək, ürəkləndirmək, ilhamlandırmaq, şövqə gətirmək, canlandırmaq; **to ~** *smb.* **to a feat** bir kəsi qəhrəmanlığa ruhlandırmaq

**instability** [ˌɪnstə'bɪlɪtɪ] *n* səbatsızlıq, qərarsızlıq, dəyişkənlik; davamsızlıq; **mental ~** ruhi dəyişkənlik; **financial ~** maliyyə dəyişkənliyi; **political ~** siyasi səbatsızlıq

**instable** [ɪn'steɪbl] *adj* möhkəm olmayan; səbatsız, dayanaqsız; dəyişkən; davamsız, tezsınan, tezdağılan, tezqırılan

**instal** [ɪn'stɔ:l] *v amer.* = **install**

**install** [ɪn'stɔ:l] *v* **1.** rəsmi olaraq vəzifəyə qoymaq / gətirmək; **to ~ a professor / a judge** professoru / hakimi rəsmi olaraq vəzifəyə qoymaq; **2.** yerləşdirmək, yer eləmək; **to ~** *smb.* **comfortably by /at the fireside** bir kəsi buxarının yanında rahatca yerləşdirmək; **to be comfortably ~ed in** *one's* **new home** təzə evində rahatca yerləşmək; **3.** *tex.* qurmaq, quraşdırmaq, düzəltmək; **to ~ a heating system** qızdırıcı sistem quraşdırmaq; **to ~ video cameras in the city centre** şəhərin mərkəzində video kameralar quraşdırmaq

**installation** [ˌɪnstə'leɪʃn] *n* **1.** rəsmi olaraq vəzifəyə qoyma/gətirmə; **to perform the ceremony of ~** vəzifəyə gətirmək üçün mərasim düzəltmək; **the ~ of the new vice-president** yeni vitse prezidenti rəsmi olaraq vəzifəyə qoyma; **2.** quraşdırma, quraşdırılma, yerləşdirmə; yığma; montaj; **3.** qurğu, cihaz; **nuclear ~s** nüvə qurğuları; **military ~s** hərbi qurğular

**instalment** *(amer.* **installment)** [ɪn'stɔ:lmənt] *n* **1.** növbəti üzvlük haqqı *(möhlətlə alınan şeyin pulunu ödəyərkən)*; hissə-hissə ödəmə; **to pay by/in ~s** hissə-hissə ödəmək; **2.** ayrıca buraxılış *(kitab və s. haq.)*; **a novel published in/by ~** ayrıca buraxılışla nəşr edilmiş roman; **3.** hissə, bir partiya *(müəyyən miqdar mal)*; **the first ~ of the goods ordered** sifariş edilmiş malın birinci partiyası

**instance**[1] ['ɪnstəns] *n* **1.** nümunə, örnək, misal; xüsusi hadisə / hal; **to give / to cite an ~ or two** bir və ya iki misal vermək; **to take as an ~** misal / nümunə olaraq götürmək; **familiar ~** məlum hadisə; **modern ~** müasir misal; **the most striking ~ of** *smth.* bir şeyin ən parlaq misalı / numənsi; **in this ~** bu halda; **in some ~s** bir sıra hallarda; **in the great majority of ~s** əksər hallarda; **2.** tələb; (qətiyyətli) xahiş; təkid, israr; **at the ~ of** *smb.*, **at** *smb.'s* **~** bir kəsin tələbilə;

◊ **for ~** məsələn, misal üçün; **in the first ~** hər şeydən əvvəl, ilk növbədə; əvvəlcə, əvvəlcədən, öncə, öncədən

**instance²** [ˈɪnstəns] *v* misal/nümunə olaraq vermək, misal / nümunə gətirmək

**instant¹** [ˈɪnstənt] *n* 1. an, göz qırpımı; dəqiqə, ləzhə; **the ~ you call for me** mənim dalımca gələn kimi; **this ~** bu dəqiqə/an; *Stop talking this instant Danışığı bu saatca kəs / kəsin; Don't waste an instant Bir an/dəqiqə itirmə / itirməyin; At this very instant Elə bu anda;* **in an ~** 1) dərhal, təxirsiz, təxirə salmadan; 2) bir anda; **to leave for an ~** bir dəqiqəliyə getmək

**instant²** [ˈɪnstənt] *adj* 1. dərhal, cəld, təcili; ani; **~ response** təcili cavab; **~ death** ani ölüm; 2. tez, bir anda hazırlanan *(yemək, içmək haq.)*; **~ coffee** dərhal həll olunan kofe/qəhvə; 3. bilvasitə, birbaşa; **~ dependence** birbaşa asılılıq; **the ~ connection between** *smth.* bir şey arasında bilvasitə əlaqə; 4. inadlı, təkidli; çox lazımlı / zəruri / gərəkli; **to be in ~ need of** *smth.* bir şeyə çox ehtiyac hiss etmək

**instantaneous** [ˌɪnstənˈteɪnɪəs] *adj* 1. ani; **~ decision / action** ani qərar / hərəkət; 2. təcili, təxirsiz, təxirəsalınmaz; **~ reply** təxirəsalınmaz cavab

**instantaneously** [ˌɪnstənˈteɪnɪəslɪ] *adv* dərhal, yubanmadan, təxirə salmadan, təxirsiz olaraq

**instantly** [ˈɪnstəntlɪ] *adv* 1. dərhal, tez, cəld, dayanmadan, tezliklə; 2. inadla, təkidlə, israrla

**instead** [ɪnˈsted] *adv* əvəzinə, yerinə; *Stuard was ill so I went instead Stuard xəstə idi, buna görə də onun əvəzinə mən getdim*

**instead of** [ɪnˈstedəv] *prep* əvəzinə, yerinə; **~ him** onun əvəzinə / yerinə; *Have some tea instead of coffee Kofenin əvəzinə bir az çay iç /için; Instead of working he read a book İşləmək əvəzinə o, kitab oxudu*

**instep** [ˈɪnstep] *n* ayağın/ayaqqabının üst tərəfi; *The shoes are too tight across/at the instep Ayaqqabının üstü çox dardır /sıxır*

**instigate** [ˈɪnstɪgeɪt] *v* 1. **(to)** təhrik / sövq / vadar etmək, həvəs oyatmaq; **to ~ smb. to do smth.** bir kəsi bir şey etməyə təhrik etmək; **to ~ smb. to a crime** bir kəsi cinayətə sövq etmək; 2. qızışdırmaq, fitnələmək; **to ~ war** müharibəyə qızışdırmaq/ təhrik etmək; **to ~ murder** qətlə / ölümə səbəb olmaq

**instigation** [ˌɪnstɪˈgeɪʃn] *n* təhrikçilik, qızışdırıcılıq, təhrik etmə, yoldan çıxarma, tovlama; **at / by the ~ of** *smb.* bir kəsin təhrikçiliyi ilə

**instigator** [ˈɪnstɪgeɪtəʳ] *n* təhrikçi, fitləyən, qızışdıran; **the ~s of the rebellion** qiyamın təhrikçiləri

**instil** *(amer.* **instill** [ɪnˈstɪl] *v* 1. təlqin etmək *(hər hansı bir hissi)*; doğurmaq, yaratmaq *(qorxu və s.)*; **to ~ (a) love for** *smth.* bir şeyə qarşı məhəbbət doğurmaq /yaratmaq; **to ~ a sense of responsibility in** *smb.* bir kəsdə məsuliyyət hissi yaratmaq; 2. *tib.* kiçik dozalarla yeritmək, damcı-damcı buraxmaq, damcılatmaq

**instinct** [ˈɪnstɪŋkt] *n* 1. instinkt, təbii hiss; **the ~ of self-preservation** özünü mühafizə etmə / qoruma instinkti; **to do** *smth.* **by ~** bir işi intuisiya ilə görmək; **to rely on ~** duyma qabiliyyətinə arxalanmaq; **to be endowed with ~** təbii hiss etmə / duyma qabiliyyəti verilmək; 2. təbii qabiliyyət, anadangəlmə; **to be by ~ a critic** anadangəlmə tənqidçi olmaq; *He has a natural instinct for music O, anadangəlmə / təbiətən musiqiçidir*

**instinctive** [ɪnsˈtɪŋktɪv] *adj* instinktiv, qeyri-iradi; **~ movement** instinktiv / qeyri-iradi hərəkət; **~ horror of** *smth.* bir şeydən instinktiv olaraq qorxma; **an ~ sense of danger** təhlükəni instinktiv olaraq hiss etmə

**instinctively** [ɪnsˈtɪŋktɪvlɪ] *adv* instinktiv olaraq, qeyri-iradi tərzdə

**institute¹** [ˈɪnstɪtju:t] *n* 1. institut, elmi-tədqiqat müəssisəsi, tədris müəssisəsi; **a research ~** elmi-tədqiqat institutu; **Institute of Technology** Texnologiya institutu; **Biological Institute** Biologiya institutu; 2. cəmiyyət, birlik, ittifaq *(elmi, dini və s.)*; 3. *amer.* qısamüddətli kurslar; 4. axşam məktəbi, kəndli gənclər üçün peşə məktəbi

**institute²** [ˈɪnstɪtju:t] *v* 1. qurmaq, quraşdırmaq, düzəltmək; əsasını qoymaq, təsis etmək, əsasını/binasını/təməli qoyulmaq; tətbiq etmək; **to ~ a society** cəmiyyət təsis etmək; **to ~ a government** hökumət qurmaq; **to ~ a law** qanun tətbiq etmək; 2. başlamaq *(tədqiqatı, istintaqı və s.)*

**institution** [ˌɪnstɪˈtju:ʃn] *n* 1. cəmiyyət, təşkilat, müəssisə, idarə; birlik; **charitable ~** xeyriyyə müəssisəsi; **literary ~** ədəbi birlik; 2. müəyyən/təyin etmə; təsis/təşkil etmə; həyata keçirmə; **the ~ of old-age insurance** qocalığa görə təqaüd təsis etmə

**institutional** [ˌɪnstɪˈtju:ʃənl] *adj* 1, təsis / təşkil edilmiş; düzəldilmiş; qurulmuş, quraşdırılmış, təsis edilmiş; bərqərar edilmiş/olmuş; **~ principles** bərqərar olmuş prinsiplər; 2. ilk, başlanğıc, ibtidai; elementar; **~ instruction** əsas/ilk təlimat; **the ~ legend** əfsanənin ilk variantı; 3. xeyriyyə, müalicə və digər xeyriyyə müəssisələrinə aid olan

**instruct** [ɪnˈstrʌkt] *v* 1. öyrətmək; **to ~ a child** uşağı öyrətmək; **to ~ smb. in history / in geography, etc.** bir kəsə tarixi, coğrafiyanı və s. öyrətmək; **to ~ a group of 16 years olds in first aid** bir qrup 16 yaşlılara ilk yardım göstərməyi öyrətmək; *They instructed me in the best ways of doing the job Onlar mənə işi görməyin ən yaxşı yollarını öyrətdilər;* 2. təlimatlandırmaq, təlimat/göstəriş / əmr vermək; *He acted as he was instructed Necə göstəriş verilmişdirsə, o, elə də hərəkət etdi; I instructed him to come to work earlier Mən ona göstəriş verdim ki, işə daha tez gəlsin;* 3. *hüq.* məlumatlandırmaq,



məlumat vermək; xəbərdar etmək, xəbər vermək, bildirmək; **to ~ smb. of what is going on** nə baş verdiyi haqqında bir kəsi məlumatlandırmaq/xəbərdar etmək; **to be ~ed in good time** əvvəlcədən xəbərdar edilmək; *The judge instructed the witness that he should tell the whole truth Hakim şahidə əvvəlcədən bildirdi ki, o bütün həqiqəti danışmalıdır*

**instruction** [ɪnˈstrʌkʃn] *n* 1. öyrətmə, oxutma, təhsil vermə; **the ~ of youth** gəncləri oxutma, gənclərə təhsil vermə; **to give ~ in English/in music/in swimming** ingilis dilini/musiqini /üzməyi öyrətmək; 2. təlimat, təlimat vermə; sərəncam / göstəriş vermə; 3. təhsil, bilik; savadlılıq; **high-school ~** *amer.* tam orta təhsil; **a man of fine ~** çox savadlı adam; **to receive ~** təhsil almaq; 4. *adətən pl* təlimat, göstəriş, sərəncam; **to follow ~s** göstərişə əməl etmək; **to conform to/to comply with ~s** qaydaya/sərəncama tabe olmaq, göstərişi / sərəncamı yerinə yetirmək

**instructional** [ɪnˈstrʌkʃənl] *adj* maarifləndirici, maarifə/təhsilə / biliyə kömək edən; tərbiyəvi; tədris; **~ film** tədris filmi

**instructive** [ɪnˈstrʌktɪv] *adj* ibrətli, ibrətamiz, ibrət alınacaq, ibrətverici; faydalı; **~ lecture** faydalı mühazirə; **~ conversation /talk** ibrətamiz söhbət/danışıq; **~ experience** faydalı təcrübə

**instructor** [ɪnˈstrʌktəʳ] *n* 1. müəllim; 2. təlimatçı; rəhbər *(dərnəyə və s.)*; 3. sorğu/ arayış kitabçası; dərslik, təlimat, göstəriş

**instrument** [ˈɪnstrumənt] *n* 1. alət, cihaz; **surgical ~s** cərrah alətləri; **~s of torture** işkəncə alətləri; **to be an ~ in** *smb.'s* **hands** bir kəsin əlində alət olmaq; 2. vasitə; **~ of aggression** təcavüz vasitəsi; **~ of vengeance / of revenge** qisas vasitəsi; 3. musiqi aləti; **stringed / wind ~s** simli / nəfəsli musiqi alətləri; **to play (on) an ~** musiqi alətində çalmaq; **to tune an ~** musiqi alətini kökləmək; 4. sənəd; akt; fərman; **ratification ~s** ratifikasiya olunmuş sənəd/fərman; **~ of surrender** təslim olma aktı

**instrumental** [ˌɪnstruˈmentl] *adj* 1. alət kimi istifadə edilən; faydalı, mənfəətli, müəyyənedici; **to be ~ in bringing about** *smth.* bir məqsədə çatmaq üçün faydalı olmaq; **~ in doing** *smth.* bir şeyin təşkilində aparıcı rolu olan; 2. alət / cihaz vasitəsilə görülən; 3. *mus.* instrumental; **~ music** instrumental musiqi; 4. *qram.*: **~ case** instrumental hal, birgəlik halı

**instrumentalist** [ˌɪnstruˈmentəlɪst] *n* instrumentalist, çalğıçı *(bir musiqi alətində çalan adam)*

**instrumentation** [ˌɪnstrumenˈteɪʃn] *n* 1. *mus.* instrumentovka *(bir musiqi əsərini orkestrdə çalmaq üçün uyğunlaşdırma)*, orkestrovka *(orkestr üçün uyğunlaşdırma)*; 2. alətlərdən/cihazlardan istifadə etmə

**insubordinate** [ˌɪnsəˈbɔ:dənɪt] *adj* itaətsiz, itaət etməyən, tabe olmayan, boyun əyməyən, dikbaş

**insubordination** [ˈɪnsəˌbɔ:dɪˈneɪʃn] *n* itaətsizlik, itaət etməmə, tabe olmama, baş / boyun əyməmə, dikbaşlıq

**insubstantial** [ˌɪnsəbˈstænʃl] *adj* 1. davamsız, tezsınan, kövrək, tezqırılan; *Early aircraft were insubstantial construction of wood and glue İlk təyyarələr / aviasiya davamsız taxta və yapışqandan ibarət idi;* 2. zərif, zəif, incə; **as ~ as a cobweb** hörümçək toru kimi zərif; **~ figure** zərif / incə qamət; **an ~ argument** zəif sübut /dəlil; 3. qeyri-real, real olmayan; zahiri, xəyali

**insufferable** [ɪnˈsʌfərəbl] *adj* dözülməz, qatlaşılmaz; **an ~ person** dözülməz adam; **~ insolence** dözülməz həyasızlıq /abırsızlıq; **~ rudeness** dözülməz kobudluq; *He's insufferable O, dözülməzdir*

**insufferably** [ˌɪnˈsʌfərəblɪ] *adv* dözülməz bir tərzdə/dərəcədə, qatlaşılmaz dərəcədə

**insufficiency** [ˌɪnsəˈfɪʃənsɪ] *n* 1. azlıq, çatışmazlıq, yetişməmə, kəsir; kifayətsizlik; **~ of food / of provisions** yemək / ərzaq çatışmazlığı; **~ of health** sağlamlığın zəifliyi; 2. *tib.* çatışmazlıq; **~ of the heart** ürək çatışmazlığı

**insufficient** [ˌɪnsəˈfɪʃnt] *adj* az, kifayətsiz, kifayət etməyən, natamam, yarımçıq; müvafiq gəlməyən; qeyri-kafi; **an ~ quantity of** *smth.* bir şeydən lazımi miqdarda olmama; **~ help** yarımçıq/kifayət etməyən kömək; **~ information** məlumatın azlığı /qeyri-qənaətbəxşliyi; **~ time** az / kifayət etməyən vaxt

**insufficiently** [ˌɪnsəˈfɪʃntlɪ] *adv* az, qeyri-kafi, yetişməyəcək qədər/dərəcədə, kifayət etməyəcək dərəcədə / qədər; qeyri-qənaətbəxş

**insular** [ˈɪnsjuləʳ] *adj* 1. ada; **~ climate** ada iqlimi/ab-havası; **~ fortress** adada yerləşən qala

**insularity** [ˌɪnsjuˈlærɪtɪ] *n* 1. ada vəziyyəti; **the ~ of Great Britain** Böyük Britaniyanın ada vəziyyəti; 2. təcrid olunma, ayrılıq, təklik; qapalılıq; təmkinlilik, təmkin

**insulate** [ˈɪnsjuleɪt] *v* 1. ayırmaq, təcrid etmək; 2. *tex.* izolyasiya etmək; *Plastic insulates well Plastika yaxşı izolyasiya edir*

**insulated** [ˈɪnsjuleɪtɪd] *adj* 1. təcrid olunmuş/edilmiş, yalqız, təkcə, ayrıca duran; **~ house** tənha ev; **~ life** təcrid olunmuş/ qapalı həyat; 2. *tex.* izolə edilmiş; **~ wire** izolə edilmiş məftil; 3. adaya çevrilmiş, su ilə əhatə olunmuş

**insulation** [ˌɪnsjuˈleɪʃn] *n* 1. təcrid etmə, ayırma; ayrılıq, təklik; 2. *el.* izolə etmə; izolə etmək üçün material; **heat ~** istiliyi izolə etmə; **sound ~** səsi izolə etmə

**insulator** [ˈɪnsjuleɪtəʳ] *n* izolyasiya, izolyasiya materialı; elektrik / isti keçirməyən material / cisim

**insulin** [ˈɪnsjulɪn] *n əcz.* insulin

**insult¹** [ˈɪnsʌlt] *n* təhqir, təhqir etmə, həqarət; inciklik; **personal ~** şəxsi inciklik; **to bear an ~** təhqir olunma; **to put an ~ upon** *smb.* bir kə-

si təhqir etmək *(xüs. açıq şəkildə)*; **to hurl / to fling an ~ at / against** ***smb.*** bir kəsin üzünə qarşı təhqir yağdırmaq; **to swallow an ~** təhqiri udmaq; **an ~ to the memory of our brave soldiers** bizim qəhrəman əsgərlərimizin xatirəsinə təhqir

**insult[2]** [ˈɪnsʌlt] *v* təhqir etmək, alçaltmaq; incitmək; **to ~** ***smb.*** bir kəsi təhqir etmək; *I didn't want to insult you Mən səni / sizi incitmək istəmirdim*

**insulting** [ɪnˈsʌltɪŋ] *adj* təhqiredici, həqarətli, alçaldıcı, toxunan; **~ speech** təhqiredici/toxunan nitq; **~ behaviour** həqarətli / təhqiredici davranış

**insuperable** [ɪnˈsju:pərəbl] *adj* dəfedilməz, güc-çatmayan, aradan qaldırıla bilməyən, öhdəsindən gəlmək mümkün olmayan, həlledilməz; **~ difficulties** güccatmayan çətinliklər; **~ problems** güccatmayan / həlledilməz problemlər

**insupportable** [ˌɪnsəˈpɔ:təbl] *adj* **1.** dözülməz, qatlaşılmaz, şiddətli, bərk; **~ pain** dözülməz ağrı; **~ heat/cold** dözülməz isti / soyuq; **~ burden** qatlaşılmaz yük; *It is insupportable to me Bu mənim üçün dözülməzdir*; **2.** əsassız, əsaslandırılmayan; **~ claim** əsassız iddia / tələb

**insurance[1]** [ɪnˈʃuərəns] *n* **1.** sığorta, sığorta etmə/etdirmə/edilmə; **social ~** ictimai sığorta; **~ upon lives** həyatı sığorta etmə; **~ against fire** yanğından sığorta etmə/etdirmə; **to effect / to obtain a life ~** həyatı sığorta etdirmək; **2.** sığortanın məbləği

**insurance[2]** [ɪnˈʃuərəns] *adj* sığorta; **~ agent /broker** sığorta agenti; **~ company** sığorta cəmiyyəti; **~ policy** sığorta siyasəti

**insure** [ɪnˈʃuəʳ] *v* **1.** sığorta etmək/etdirmək; **to ~** ***one's*** **life / person** öz həyatını sığorta etdirmək; **to ~** ***one's*** **house/property against fire** yanğına qarşı öz evini /əmlakını sığorta etdirmək; **2.** sığorta olunmaq; **to ~ at a low premium** çox az məbləğdə sığorta olunmaq; **3.** təmin etmək, qarantiya vermək; **to ~ success** nailiyyəti təmin etmək; **to ~ high and uniform heat** yüksək və sabit temperaturu təmin etmək; **4.** (**against, from**) qorumaq, qoruyub saxlamaq, mühafizə etmək; qarşısını almaq; **to ~** ***smb.*** **against / from** ***smth.*** bir kəsi bir şeydən qorumaq / mühafizə etmək; **to ~** ***smb.*** **against making mistakes** bir kəsi səhv etməkdən çəkindirmək, bir kəsin səhv etməsinin qarşısını almaq

**insurer** [ɪnˈʃuərəʳ] *n* sığortaçı, sığorta edən

**insurgent[1]** [ɪnˈsə:dʒənt] *n* üsyançı, qiyamçı, iğtişaşçı

**insurgent[2]** [ɪnˈsə:dʒənt] *adj* **1.** üsyançı, qiyamçı, qiyam edən; **2.** coşmuş, coşğun; **~ waves** coşmuş dalğalar; **the ~ sea** coşmuş dəniz

**insurmountable** [ˌɪnsə:ˈmauntəbl] *adj* aradan qaldırıla bilməyən, kənar edilə bilməyən, öhdəsindən gəlmək mümkün olmayan; **~ difficulties** aradan qaldırıla bilməyən çətinliklər

**insurrection** [ˌɪnsəˈrekʃn] *n* üsyan; qiyam; **an armed ~** silahlı üsyan; **to rise in ~** üsyan etmək, qiyam qaldırmaq; *Disturbances soon turned into full-scale insurrection İğtişaş tezliklə tam miqyaslı üsyana çevrildi*

**intact** [ɪnˈtækt] *adj* ziyan dəyməmiş, toxunulmamış, bütöv; **to be left ~** toxunulmamış qalmaq; *The parcel arrived intact Bağlama sağ-salamat gəlib çatdı*

**intake** [ˈɪnteɪk] *n* **1.** çəkmə, alma; **an ~ of breath** nəfəs alma / çəkmə; **2.** işlətmə, sərf etmə; **the annual ~** illik işlətmə / sərfetmə / istehlak; **3.** qəbul, qəbul etmə *(işə, məktəbə)*; **the yearly ~ of students** illik tələbə qəbulu; *The intake in state primary schools is down by 10% Dövlət məktəblərinə qəbul 10% azalıb*; **4.** *tex.* boruda dar yer; yanacağın/havanın daxil olduğu yer *(maşında və s.)*; **the air/fuel ~** hava / yanacaq daxil olan yer *(kamera)*

**intangibility** [ɪnˌtændʒəˈbɪlɪtɪ] *n* hiss edilməzlik, duyulmazlıq, duyulmama; sezilməzlik, aydın / aşkar olmama

**intangible** [ɪnˈtændʒəbl] *adj* **1.** duyulmayan, hissedilməz, hiss olunmayan; əhəmiyyətsiz; **an ~ quality** hissedilməz keyfiyyət; **2.** kiçik, cüzi; **~ difficulties** kiçik / cüzi çətinliklər

**intangibly** [ɪnˈtændʒəblɪ] *adv* anlaşılmaz / hissolunmaz bir tərzdə

**integer** [ˈɪntədʒəʳ] *n riyaz.* tam ədəd; *3 and 4 are integers 3 və 4 tam ədədlərdir*

**integral[1]** [ˈɪntɪgrəl] *n* **1.** tam, bölünməz; **2.** *riyaz.* inteqral

**integral[2]** [ˈɪntɪgrəl] *adj* **1.** ayrılmaz, əsas; **an ~ part of** ***smth.*** bir şeyin ayrılmaz hissəsi; **to be ~ to** ***smth.*** bir şeyin ayrılmaz hissəsi olmaq; **an ~ part of American defence strategy** Amerikanın müdafiə strategiyasının ayrılmaz hissəsi; **2.** *riyaz.* inteqral; **~ calculus** inteqral hesablama

**integrality** [ˌɪntɪˈgrælɪtɪ] *n* tamlıq, bütövlük, ayrılmazlıq

**integrally** [ˈɪntɪgrəlɪ] *adv* **1.** bütövlüklə, tamamilə, büsbütün; **2.** ayrılmaz hissə kimi, ayrılmaz tərzdə

**integrate** [ˈɪntɪgreɪt] *v* **1.** vahid halda birləşdirmək; **to ~ private schools into state education system** xüsusi məktəbləri dövlət təhsil sisteminə vahid halda birləşdirmək; **2.** birləşmək; *Do they really want to integrate with us Doğrudanmı onlar bizimlə birləşmək istəyirlər?*; **3.** *riyaz.* inteqrallamaq *(birləşdirmək)*

**integration** [ˌɪntɪˈgreɪʃn] *n* inteqrasiya, birləşmə, birləşdirmə; **economic/political/ social ~** iqtisadi/siyasi/ictimai inteqrasiya

**integrity** [ɪnˈtegrɪtɪ] *n* **1.** düzlük, təmizlik, doğruluq, vicdanlılıq, səmimiyyət; **a man of ~** düz /vicdanlı/səmimi adam; **2.** təmizlik, bütövlük, toxunulmazlıq; **the ~ of an ancient manuscript** qədim əlyazmasının toxunulmazlığı; **the ~ of a language** dilin təmizliyi; **to guarantee the territorial ~ of a country** ölkənin ərazi bütövlüyünə qarantiya /təminat vermək; **to respect a nation's territorial ~** ölkənin ərazi bütövlüyünə hörmət etmək



**intellect** [ˈɪntəlekt] *n* ağıl, zəka, idrak, zehin, ağlın/zehnin inkişaf səviyyəsi; intellekt; **a man of mighty ~** çox ağıllı/idraklı adam; *He was one of the greatest intellects of his time O, öz zamanəsinin / dövrünün ən ağıllı adamlarından biri olmuşdur*; **the ~(s) of the age** əsrin/dövrün ağıllı / zəkalı adamları

**intellectual[1]** [ˌɪntɪˈlektjuəl] *n* ziyalı, ziyalı nümayəndəsi; **the ~s** *top.i* ziyalılar

**intellectual[2]** [ˌɪntɪˈlektjuəl] *adj* **1.** əqli, zehni; fikri; **~ process** əqli proses; **~ faculties** əqli/zehni qabiliyyətlər; **2.** ağıllı, zəkalı, zehinli; **~ person** ağıllı/zəkalı adam; **in the ~ world** ziyalılar aləmində

**intellectually** [ˌɪntɪˈlektjuəlɪ] *adv* əqli/zehni/ fikri cəhətdən; ağılla, fikirlə

**intelligence[1]** [ɪnˈtelɪdʒəns] *n* **1.** ağıl; zəka, zehin, şüur; əqli/zehni qabiliyyət; **a person of high/average/low ~** yüksək/orta/ aşağı əqli qabiliyyətə malik adam; **to be defective in ~** ağıldan qüsurlu olmaq; **to be of quick ~** fərasətli / düşüncəli/ zəkalı olmaq; **2.** məlumat, informasiya; **3.** *hərb.* kəşfiyyat məlumatı; kəşfiyyatın əldə etdiyi material; **4.** kəşfiyyat

**intelligence[2]** [ɪnˈtelɪdʒəns] *adj* kəşfiyyat; **~ service** kəşfiyyat xidməti; **~ report** *hərb.* kəşfiyyat məlumatı; **~ sources** kəşfiyyat mənbələri; **~ officer** *hərb.* kəşfiyyat rəisi; qərargahın kəşfiyyat dəstəsinin/bölməsinin rəisi; **~ police** əks-kəşfiyyat; **~ test** qabiliyyət testi

**intelligent[1]** [ɪnˈtelɪdʒənt] *n* ağıllı / fərasətli / zehinli adam

**intelligent[2]** [ɪnˈtelɪdʒənt] *adj* **1.** ağıllı, zəkalı, fərasətli, dərrakəli; **an ~ child** ağıllı/fərasətli/dərrakəli uşaq; **~ question/reply** ağıllı sual /cavab; **to conduct oneself like an ~ person** özünü ağıllı / dərrakəli adam kimi aparmaq; **2.** fəhmli, dərkedən, başadüşən

**intelligently** [ɪnˈtelɪdʒəntlɪ] *adv* ağıllı, ağılla, ağıl ilə, düşünərək, məntiqlə, başa düşərək

**intelligentsia** [ɪnˌtelɪˈdʒentsɪə] *n*: **the ~** ziyalılar

**intelligible** [ɪnˈtelɪdʒəbl] *adj* aydın, anlaşıqlı, anlaşılan, başadüşülən; **an ~ description /explanation** aydın təsvir/izahat; **~ pronunciation** aydın/başadüşülən tələffüz; **~ speech** anlaşıqlı / anlaşılan nitq; **a statement ~ to all** hamının başa düşə biləcəyi / anlayacağı bəyanat; *His lecture was intelligible to most of the students Onun mühazirəsi əksər tələbələr üçün anlaşılan / başadüşülən idi*

**intelligibly** [ɪnˈtelɪdʒəblɪ] *adv* aydın, aşkar, açıq, anlaşıqlı, anlaşılacaq bir tərzdə

**intemperance** [ɪnˈtempərəns] *n* **1.** özünü / nəfsini saxlamama, pəhriz gözləməmə, özünü saxlamama/gözləməmə; ifratçılıq, israf; **~ in drink** içkiyə həddən artıq meyl/həvəs; **2.** səbirsizlik, hövsələsizlik, təmkinsizlik; çılğınlıq

**intemperate** [ɪnˈtempərət] *adj* **1.** nəfsini / özünü saxlamayan, pəhriz gözləməyən; həddindən artıq istifadə edən *(xüs. spirtli içkilərdən)*; **~ habits** içmək adəti; **2.** səbirsiz, hövsələsiz, təmkinsiz; ötkəm, çılğın

**intend** [ɪnˈtend] *v* **1.** niyyət etmək, ...niyyətində /...fikrində /...qəsdində olmaq, istəmək; *What do you intend to do Sən/ Siz nə etmək fikrindəsən?/fikrindəsiniz?*; *I intend to go Mən getmək fikrindəyəm*; *I intend them to go Mən istəyirəm ki, onlar getsin*; *They intend to marry Onlar evlənmək niyyətindədirlər*; **2.** irəlicədən/öncədən / qabaqcadan təyin / müəyyən etmək, nəzərdə tutmaq; *This book is intended for children Bu kitab uşaqlar üçün nəzərdə tutulub*; *This remark is intended for him Bu irad ona aiddir*; *This is intended as a gift for you Bu sənin/sizin üçün hədiyyədir*; **3.** nəzərdə tutmaq, demək istəmək; *What do you intend by your words? Sən/Siz bu sözlərlə nə demək istəyirsən? / istəyirsiniz?*

**intended** [ɪnˈtendɪd] *adj* **1.** güman / təxmin / fərz/ehtimal edilən, nəzərdə tutulmuş; **a book ~ for children** uşaqlar üçün nəzərdə tutulmuş kitab; **~ result** güman edilən/nəzərdə tutulan nəticə; **~ meaning** təxmin edilən məna; **her ~ husband** onun güman edilən gələcək əri; **2.** qəsdən, bilərəkdən; qəsdlə/qərəzlə edilən; **~ insult** qəsdlə edilən təhqir; **3.** irəlicədən /qabaqcadan/öncə təyin edilmiş; saxlanılmış, ayrılmış; **a place ~ for** ***smb.*** bir kəs üçün ayrılmış / saxlanılmış yer

**intense** [ɪnˈtens] *adj* **1.** bərk, şiddətli; kəskin, həddindən artıq/çox; **~ cold** bərk/şiddətli soyuq; **~ heat** bərk / şiddətli isti; **~ pain** kəskin / şiddətli ağrı; **~ longing** kəskin / şiddətli arzu/həsrət; **~ darkness** bərk qaranlıq; **~ hatred** şiddətli / həddən artıq nifrət; **~ stupidity** həddən artıq axmaqlıq / sarsaqlıq; **2.** qatı, tünd; **~ colour** qatı / tünd boya; **~ blue** qatı / tünd mavi; **3.** gərgin, qızğın; intensiv; **~ studies** intensiv/gərgin məşğələlər; **an ~ face** gərgin sifət; **~ attention** gərgin diqqət; **~ thought** gərgin fikir; **~ activity** intensiv / gərgin fəaliyyət; **~ competition** intensiv / gərgin / qızğın yarış

**intensely** [ɪnˈtenslɪ] *adv* **1.** çox qızğın, bərk, kəskin, hərarətlə; həddən artıq; **to love ~** qızğın/hərarətlə sevmək; **an ~ cold night** həddən artıq soyuq gecə; **to be ~ keen on** ***smth.*** bir şeyi bərk/çox istəmək; *The girl loved him intensely Qız onu çox/hərarətlə sevirdi*; **2.** gərgin bir halda / surətdə, gərgin olaraq; diqqətlə; **to listen to** ***smb.*** **~** bir kəsə diqqətlə qulaq asmaq

**intenseness** [ɪn'tensnɪs] *n* **1.** qatılıq; **~ of colour** boyanın/rəngin qatılığı; **2.** gərginlik, intensivlik; **to work with ~** gərgin işləmək

**intensification** [ɪn,tensɪfɪ'keɪʃn] *n* **1.** gərginlik, gərginləşmə; **2.** intensivləşdirmə, intensivləşmə; gücləndirmə, güclənmə, qüvvətləndirmə, qüvvətlənmə

**intensifier** [ɪn'tensɪfaɪəʳ] *n* **1.** gücləndirici *(elektrik cərəyanının gücünü və gərginliyini artıran cihaz)*; **2.** gücləndirici maddə; **3.** *tex.* multiplikator *(həssas qalvanometr)*

**intensify** [ɪn'tensɪfaɪ] *v* **1.** gücləndirmək, qüvvətləndirmək, artırmaq; **to ~ the heat** istiliyi artırmaq; **to ~ *one's* attention** diqqətini artırmaq/gərginləşdirmək; **2.** artmaq, güclənmək; *The wind intensifies Külək güclənir; The terrorists have intensified bombing campaign Terroristlər bombalama kompaniyasını gücləndiriblər*

**intensity** [ɪn'tensɪtɪ] *n* **1.** intensivlik, güc; **~ of sound** səsin gücü; **~ of passion/of faith** ehtirasın/inamın gücü; **to lessen the ~ of the heat** istiliyin gücünü/intensivliyini azaltmaq; **to look at *smb.* with a stern ~** gözünü bir kəsə hirslihirsli zilləmək; **2.** *el.* gərginlik; **the degree of ~** gərginliyin dərəcəsi

**intensive** [ɪn'tensɪv] *adj* **1.** intensiv, gərgin; **~ development** intensiv inkişaf; **~ attention** gərgin diqqət; **~ thinking** hərtərəfli fikirləşmə; **~ training** gərgin / intensiv məşq; **2.** dərin, ətraflı; **~ study of *smth.*** bir şeyi dərindən / ətraflı öyrənmə; **3.** *k.t.* intensiv; **~ farming** torpağı intensiv becərmə; **4.** *qram.* gücləndirici; **~ particle** gücləndirici ədat

**intensively** [ɪn'tensɪvlɪ] *adv* gərgin, qızğın, səmərəli; **to work ~** gərgin işləmək

**intent¹** [ɪn'tent] *n* **1.** niyyət, məram, məqsəd, arzu, murad, fikir; **with good ~** xoş niyyətlə / məramla / məqsədlə; **with evil ~** pis niyyətlə / məqsədlə / fikirlə; **with ~ to do *smth.*** bir şeyi etmək niyyətilə / məramılə / məqsədilə; **2.** məna, fikir; **the ~ of the sentence** cümlənin mənası;
◊ **to all ~s and purposes 1)** nə olur olsun, necə olur olsun; **2)** əslində, həqiqətdə

**intent²** [ɪn'tent] *adj* **1.** gərgin, dalğın; mərkəzləşdirilmiş, bir yerə toplanmış; dikilmiş, zillənmiş *(göz, baxış haq.)*; **~ look** gərgin/zillənmiş baxış; **~ thought** gərgin /mərkəzləşdirilmiş fikir; **to be ~ on *smth.*** diqqətini bir şeyə cəmləşdirmək; **2.** (on) məşğul /başıqarışıq olan *(bir şeylə)*; **to be ~ on reading / on writing** oxumaqla / yazmaqla məşğul olmaq; **to keep *one's* mind ~ on *smth.*** həmişə bir şey haqqında düşünmək; *I was so intent on my work that I didn't notice the time Mən işimlə elə məşğul idim ki, vaxtın necə keçdiyini hiss etmədim*; **3.** tam qətiyyətli/inadlı, cəhd edən, çalışan; **to be ~ on *one's* improvement** öz təkmilliyinə/kamilliyinə can atmaq; **to be ~ on *one's* purpose** öz məqsədinə qətiyyətlə can atmaq

**intention** [ɪn'tenʃn] *n* **1.** niyyət, məram, məqsəd, arzu, fikir; səy, cəhd; **to have the ~ of doing *smth.*** bir şeyi etmək niyyəti / məqsədi / arzusu olmaq; *I have no intention of going / to go Mənim əsla getmək niyyətim/fikrim yoxdur*; **to carry out *one's* ~** öz məqsədini / niyyətini / arzusunu həyata keçirmək; **2.** *d.d.* evlənmək niyyəti/arzusu/ fikri; *He has serious intentions Onun evlənmək haqqındakı niyyəti / fikri ciddidir*

**intentional** [ɪn'tenʃənl] *adj* qəsdən/qərəzlə /biləbilə edilən, qabaqcadan düşünülmüş; **~ act** qəsdən/bilə-bilə edilən hərəkət; **an ~ suppression of facts** faktları bilə-bilə gizləmə; *I'm sorry I left you off the list - it wasn't intentional Üzr istəyirəm, sənin/sizin adını/ adınızı siyahıya salmamışam - bu qəsdən edilməyib*

**intentionally** [ɪn'tenʃənəlɪ] *adv* qəsdən, qərəzlə, bilə-bilə, bilərəkdən; *I would never intentionally hurt your feelings Mən heç vaxt bilərəkdən / qəsdən sənin / sizin xatirinə /xatirinizə dəymərəm*

**intently** [ɪn'tentlɪ] *adv* diqqətlə, səliqə ilə, əsaslı surətdə/tərzdə

**inter** [ɪn'tɜ:ʳ] *v* dəfn etmək, basdırmaq, torpağa tapşırmaq

**inter-** [-ɪn'tɜ:ʳ] *pref. Sifət, isim və fel köklərinə əlavə edilərək söz yaradır:* **inter**action qarşılıqlı təsir; to **inter**act qarşılıqlı təsir etmək; **inter**blend qarışdırmaq, **inter**connect bağlanmaq; **inter**costal qabırğaarası, qabırğa arasında olan

**interact** [,ɪntər'ækt] *v* qarşılıqlı təsir etmək, birbirinə təsir göstərmək

**interaction** [,ɪntər'ækʃn] *n* qarşılıqlı təsir / əlaqə, bir-birinə təsir etmə; **the ~ of systems** sistemlərin bir-birinə qarşılıqlı təsiri; **~ between performers and audience** ifaçıların və tamaşaçıların qarşılıqlı əlaqəsi; **the ~ of suply and demand** təminat və tələbat arasında qarşılıqlı əlaqə

**interactive** [,ɪntər'æktɪv] *adj* qarşılıqlı təsir edən/ göstərən, bir-birinə təsir edən/göstərən; **~ groups** bir-birinə qarşılıqlı təsir edən / göstərən qruplar

**interbred** ['ɪntə'bred] **to interbreed** *felinin pt, pp forması*

**interbreed** ['ɪntə'bri:d] *v* (*pt, pp* **interbred**) *k.t.* cütləşdirmək *(müxtəlif cinsli heyvanları)*; *Ducks don't normally interbreed with each other in the wild Ördəklər çöldə bir-birilə normal olaraq cütləşmirlər*

**intercede** [,ɪntə'si:d] *v* **(between)** vasitəçilik etmək; **to ~ between parties** partiyalar arasında vasitəçilik etmək; **2.** yalvarmaq, yalvarıb-yaxarmaq, yalvarıb-yaxarıb razı salmaq; **to ~ with *smb.* for another** başqasına mərhəmət göstərmək /güzəşt etmək üçün bir kəsə yalvarmaq; **3.** müdafiə/himayə etmək, tərəfdar olmaq *(bir kəsə)*, xahiş etmək; **to ~ for mercy** bağışlanmaq üçün xahiş etmək



**intercept** [,ɪntə'sept] *v* **1.** tutmaq, ələ keçirmək, zəbt etmək; **to ~ a ship/a plane** gəmi / təyyarə ələ keçirmək / tutmaq; **2.** kəsmək *(cərəyanı, suyu və s.)*; **to ~ the flow of water** suyun verilməsini kəsmək; **3.** əlaqəni kəsmək; *The storm intercepted the shore Tufan sahillə əlaqəni kəsdi*; **4.** mane olmaq, maneçilik törətmək, yolunu kəsmək; **to ~ *smb.'s* flight** bir kəsin qaçmağına mane olmaq / əngəl törətmək; **to ~ *smb.'s* influence** bir kəsin təsir göstərməsinə mane olmaq; **5.** qabağını tutmaq/kəsmək; **to ~ a view** mənzərənin qarşısını kəsmək *(yəni görünməyinə mane olmaq)*; **to ~ *smth.* from the eyes** bir şeyin qarşısını tutmaq / kəsmək

**interception** [,ɪntə'sepʃn] *n* **1.** radio verilişlərini qarışdırma; **2.** xəlvətcə/gizlicə qulaq asma *(telefon danışıqlarına)*; **3.** maneə, mane olma, əngəl

**interceptor** [,ɪntə'septəʳ] *n av.* **1.** qırıcı təyyarə; **2.** *hərb.* zenit reaktiv mərmisi

**intercession** [,ɪntə'seʃn] *n* **1.** xahiş; havadarlıq, müdafiə/himayə etmə; vasitəçilik; **to make an ~ for *smb.*** bir kəsin əvəzinə xahiş etmə, bir kəsə vasitəçilik etmə

**intercessor** [,ɪntə'sesəʳ] *n* **1.** ərizəçi, ərizə verən, xahiş edən; **2.** vasitəçi; aradüzəldən

**interchange¹** [,ɪntə'tʃeɪndʒ] *n* **1.** yer dəyişdirmə, yerini dəyişdirmə; əvəz etmə; **the ~ of letters in a word** sözdə hərflərin yerini dəyişdirmə; **~ of the front and rear tyres of a car** maşının qabaq və dal təkərlərinin yerini dəyişdirmə; **2.** mübadilə; mübadilə etmə; qarşılıqlı dəyişmə; **the ~ of letters** bir-birinə məktub göndərmə, bir-birilə məktub mübadiləsi etmə; **~ of greetings** bir-birilə salamlaşma/ hal-əhval tutma; **~ of opinions** fikir mübadiləsi etmə; **to establish an ~ of commodities between two countries** iki ölkə arasında mal/əmtəə mübadiləsi yaratmaq; **3.** növbələşmə, növbə ilə *(bir-birini)* əvəz etmə; əvəzlənmə; **the ~ of light and darkness** işıqla qaranlığın növbələşməsi

**interchange²** [,ɪntə'tʃeɪndʒ] *v* **1.** əvəz etmək, əvəzləmək, yerini dəyişmək, dəyişdirmək; **to ~ the front and rear tyres of a car** maşının qabaq və dal təkərlərinin yerini dəyişmək/dəyişdirmək; **2.** mübadilə etmək; bir-birinə göndərmək; **to ~ ideas** fikir mübadiləsi etmək; **to ~ information** bir-birinə məlumat göndərmək; **to ~ letters** məktub mübadiləsi etmək, bir-birinə məktub göndərmək; **to ~ gifts** bir-birinə hədiyyə göndərmək; **3.** növbələşmək; *He interchanged work and play O, işi və oyunu növbələşdirdi*; **4.** növbələşmək, bir-birini əvəz etmək; *Rain interchanged snow Yağış qarı əvəz etdi, Gah yağış, gah da qar yağırdı*

**interchangeable** [,ɪntə'tʃeɪndʒəbl] *adj* **1.** bir-birini əvəz edən /edə bilən; **~ parts in a machine** maşının bir-birini əvəz edə bilən hissələri; *The two words are virtually interchangeable Bu iki söz əslində bir-birini əvəz edir*; **2.** qiymətcə / dəyərcə bərabər olan, eyniqiymətli, bir qiymətli; eyni mənalı, eyni mənası olan; **~ signs / synonyms** eyni mənalı işarələr / sinonimlər; **~ products / goods** eyni qiymətli ərzaqlar / əmtəələr; **3.** dəyişən, səbatsız, qərarsız

**interchangeably** [,ɪntə'tʃeɪndʒəblɪ] *adv* bir-birini əvəz edərək, bir-birinin əvəzinə; növbə ilə, birbirinin ardınca; *The two words are used interchangeably Bu iki söz bir-birinin əvəzinə işlənir*

**inter-city** [,ɪntə'sɪtɪ] *adj* şəhərlərarası; **~ train service** şəhərlərarası qatar xidməti

**intercollegiate** [,ɪntəkə'li:dʒɪət] *adj* kolleclərarası, universitetlərarası; **~ games** kolleclərarası / universitetlərarası idman oyunları; **~ debates** universitetlərarası dibatlar/müzakirələr

**intercom** ['ɪntəkɔm] *n* **intercommunication** *sözünün qısa forması*

**intercommunicate** [,ɪntəkə'mju:nɪkeɪt] *v* **1.** birbirilə əlaqə saxlamaq/danışmaq; **2.** bir-birilə əlaqəsi olmaq *(otaq və s. haq.)*; **rooms which ~** biri-birinə bitişik/iç-içə otaqlar

**intercommunication** ['ɪntəkə,mju:nɪ'keɪʃn] *n* **1.** bir-birilə əlaqə; **2.** fikir mübadiləsi; **3.** rabitə, əlaqə; **4.** ikitərəfli və ya çoxtərəfli əlaqə / rabitə

**interconnect** [,ɪntəkə'nekt] *v* birləşdirmək; qarşılıqlı əlaqədə olmaq; **to ~ computers** kompyuterləri birləşdirmək; *I see these two ideas are somehow interconnected Məncə bu iki fikir bu və ya digər mənada əlaqədədir*

**interconnection** [,ɪntəkə'nekʃn] *n* qarşılıqlı əlaqə; birləşmə; **~s between primary and secondary education** tam və natamam təhsil arasında qarşılıqlı əlaqə

**intercontinental** [,ɪntəkɔntɪ'nentl] *adj* qitələrarası; **~ travel** qitələrarası səyahət; **~ ballistic missile** qitələrarası ballistik raket

**interconvertible** [,ɪntəkən'vɜ:təbl] *adj* bir-birini əvəz edən / edə bilən; qiymətcə / dəyərcə bərabər olan; **~ expressions** eynimənalı / sinonim ifadələr

**intercouse** ['ɪntəkɔ:s] *n* ünsiyyət, əlaqə, dostcasına münasibət; **social ~** ictimai ünsiyyət, insanlarla əlaqə; **personal ~** şəxsi əlaqə / görüş; **~ between friends** dostlar arasında ünsiyyət / əlaqə; **to have ~ with friends** dostlarla ünsiyyət / əlaqə saxlamaq; **to entertain / to maintain ~ with *smb.*** bir kəslə ünsiyyət saxlamaq; **to keep up/to continue an active ~ with *smb.*** bir kəslə sıx əlaqəni davam etdirmək; **diplomatic ~** diplomatik əlaqə; **commercial/trade ~** ticarət əlaqəsi; **facilities of ~** rabitə/əlaqə vasitələri; **to open a friendly ~ with *smb.*** bir kəslə dostluq əlaqəsi yaratmaq; *Telephones make intercouse with different parts of the country much easier Telefonlar ölkənin müxtəlif hissələri ilə əlaqəni xeyli asanlaşdırır.*

**sexual** ~ cinsi əlaqə; **illicit** ~ gizli/nikahsız yaşama; nikahsız cinsi əlaqədə olma

**interdental** [ɪntə'dentl] *adj* 1. dişarası, dişlərin arasında olan; 2. *fon.* dişarası; ~ **sound** dişarası səs

**interdepartmental** [ˌɪntə.di:pa:t'mentl] *adj* idarələrarası; **an ~ meeting** idarələrarası iclas; ~ **agreement** idarələrarası müqavilə

**interdependence** [ˌɪntədɪ'pendəns] *n* qarşılıqlı asılılıq, bir-birindən asılı olma; **to stand in close ~** bir-birindən sıx surətdə asılı olmaq; ~ **between workers and management** fəhlələrlə müdiriyyət arasında qarşılıqlı asılılıq

**interdependent** [ˌɪntədɪ'pendənt] *adj* bir-birindən asılı olan; ~ **economics** bir-birindən asılı olan iqtisadiyyatlar; ~ **nations** bir-birindən asılı ölkələr

**interdict**¹ [ˌɪntə'dɪkt] *n* 1. qadağa, yasaq, qadağan / yasaq etmə; 2. *kils.* qovma, uzaqlaşma

**interdict**² ['ɪntədɪkt] *v* 1. qadağan / yasaq etmək, qadağa/yasaq qoymaq; **to ~ books** kitablara qadağa qoymaq; **to ~ the importation of certain goods** müəyyən malların idxalına qadağa/ yasaq qoymaq; **to ~ by law** qanunla qadağan etmək; 2. qoymamaq, icazə / izn verməmək; **to ~ *smb.* from doing *smth.*** bir kəsi bir şey etməyə qoymamaq / icazə verməmək

**interdiction** [ˌɪntə'dɪkʃn] *n* 1. qadağa, yasaq; qadağa/yasaq qoyma; 2. *kils.* qovma / uzaqlaşdırma *(kilsədən)*

**interdisciplinary** [ˌɪntədɪsəp'lɪnərɪ] *adj* fənlərarası; ~ **connection** fənlərarası əlaqə; ~ **studies** fənlərarası tədqiqat

**interest**¹ ['ɪntrɪst] *n* 1. maraq; **to have (an) ~ in *smth.*** bir şeydə marağı olmaq; **to show (an) ~ in *smth.*** bir şeyə maraq göstərmək; **to lose ~ in *smth.*** bir şeyə marağı itirmək; **to excite/to awake/to arouse *smb.'s* ~** bir kəsdə maraq oyatmaq; **to listen to *smth.* with ~** bir şeyə maraqla qulaq asmaq; **of ~** maraqlı; *There's nothing of interest in the local papers Yerli qəzetlərdə maraqlı heç nə yoxdur*; **mutual / common ~s** qarşılıqlı / ümumi maraqlar; **to have / to take (an) ~ in a person** bir şəxslə maraqlanmaq; **to have / to take (an) ~ in sports** idmana maraq göstərmək, idmana marağı olmaq; **to be an object of intense ~** daimi maraq obyekti olmaq; *This is of no interest to me Bu məni əsla maraqlandırmır*; 2 *pl* mənafe, mənfəət, xeyir; qazanc; **public ~s** ictimai mənafe; **private ~s** şəxsi mənafelər; **to act for the public ~s** ictimai mənafe üçün hərəkət etmək; **to protect *one's* ~s** öz mənafelərini müdafiə etmək / güdmək; **to do *smth.* in *one's* ~s** bir şeyi öz mənfəəti / xeyiri üçün etmək; 3. pay; **to have an ~ in a business** bir biznesdə payı olmaq; 4. təsir, təsir etmə; **to have ~ with *smb.*** bir kəsin yanında nüfuzu olmaq; **to make ~ with *smb.*** bir kəsin etimadını qazanmaq; 5. faiz, faizlə gəlir; **simple ~** sadə faiz; **compound ~, ~ on ~** mürəkkəb faiz *(yəni pulun üstünə gələn puldan da faiz almaq)*; **to live on the ~ received from *one's* capital** öz kapitalından aldığı gəlirlə yaşamaq

**interest**² ['ɪntrɪst] *v* maraqlandırmaq, maraq doğurmaq; *The article interests everybody Məqalə hamını maraqlandırır*; **to ~ *smb.* in a problem** bir kəsdə problemə maraq doğurmaq; **to ~ oneself in *smth.*** 1) bir şeylə maraqlanmaq; 2) bir şeydə maraqlı olmaq

**interested** ['ɪntrɪstɪd] *adj* 1. maraqlanan, maraq göstərən; diqqətli; ~ **listener** diqqətli dinləyici; ~ **spectators** maraq göstərən tamaşaçılar; ~ **audience** diqqətli / maraq göstərən dinləyicilər; 2. tamahkar, mənfəətgüdən, öz şəxsi mənfəəti qeydinə qalan; ~ **marriage** mənfəətə görə evlənmə; 3. qərəzli, tərəfgir, qərəzkar; ədalətsiz; ~ **witness** qərəzkar / tərəfgir şahid

**interestedly** ['ɪntrɪstɪdlɪ] *adv* 1. maraqla; 2. tamahkarlıqla, öz mənfəətini güdərək; 3. qərəzkarlıqla, qərəzlə, üzgörənliklə

**interesting** ['ɪntrɪstɪŋ] *adj* maraqlı, maraq doğuran, marağa səbəb olan; ~ **conversation** maraqlı söhbət; ~ **news** maraqlı/ maraq doğuran xəbər; ~ **anecdote** maraqlı lətifə; **an ~ idea** maraqlı fikir / ideya

**interestingly** ['ɪntrɪstɪŋlɪ] *adv* maraqlı, maraqla; **to speak ~** maraqla danışmaq

**interfere** [ˌɪntə'fɪə^r] *v* 1. qarışmaq, qatışmaq; müdaxilə etmək; **to ~ in/with *smb.'s* affairs** bir kəsin işlərinə qarışmaq /müdaxilə etmək; *Don't interfere in matters that don't concern you Sənə/Sizə dəxli olmayan işlərə qarışma/qarışmayın*; 2. mane olmaq, maneçilik törətmək; *Don't interfere with me / with my work Mənə/Mənim işimə mane olma/olmayın; I shall go tomorrow, if nothing interferes Heç nə mane olmasa, mən sabah gedəcəm; This interferes with my plans Bu mənim planlarıma mane olur; Don't interfere? Mane olma!/olmayın!*; 3. toqquşmaq; ziddiyyət təşkil etmək; *Their interests interfere with each other Onların maraqları bir-biri ilə toqquşur; In this point you interfere with historical tradition Bu məsələdə sən/siz tarixən yaranmış ənənəyə zidd gedirsən/gedirsiniz*; 4. *bayt.* topuq vurmaq *(at haq.)*

**interference** [ˌɪntə'fɪərəns] *n* 1. qarışma, müdaxilə, müdaxilə etmə; ~ **in the business of others** başqalarının işinə qarışma/ müdaxilə etmə; 2. *fiz.* interferensiya *(səs, işıq və sairə dalğalarının bir-biri üzərinə düşdükdə qarşılıqlı təsir göstərməsi)*; 3. *bayt.* yara *(atın ayağında)*; 4. maneə, əngəl *(radio verilişinə qarşı)*

**interfering** [ˌɪntə'fɪərɪŋ] *adj* mane olan, maneçilik törədən; zəhlətökən, təngəgətirən, bezikdirən, usandıran

**intergovernmental** [ˌɪntə.gʌvən'mentl] *adj* hökumətlərarası; ~ **agreement** hökumətlərarası müqavilə; **an ~ conference** hökumətlərarası konfrans



**interim**¹ ['ɪntərɪm] *n* 1. ara, aralıq; fasilə; müddət, vaxt; **in the ~** 1) bu arada/dəmdə, bu vaxt; 2) müvəqqəti; **minister ad ~** müvəqqəti olaraq nazir vəzifəsini icra edən; 2. *amer.* müvəqqəti əmr/sərəncam / qərar

**interim**² ['ɪntərɪm] *adj* müvəqqəti; ilk, ilkin; aralıq; ~ **government** müvəqqəti hökumət; ~ **report** ilkin məlumat; ~ **commission** müvəqqəti komissiya; ~ **order** müvəqqəti sərəncam; *He is interim secretary O, müvəqqəti katibdir*; **to hold an ~ appointment** müvəqqəti olaraq vəzifə tutmaq

**interior**¹ [ɪn'tɪərɪə^r] *n* 1. iç, bir şeyin daxili; binanın içərisi, içəri tərəf; **the ~ of a cavern** mağaranın içi; **in the ~ of the earth** yerin altında; **the ~ of a room** otağın içi / içəri tərəfi / daxili; 2. daxili işləri *(dövlətin)*, daxili həyatı *(ölkənin)*; **Department of the Interior** Daxili İşlər Nazirliyi *(ABŞ-da və Kanadada)*; **Minister of the Interior** Daxili İşlər Naziri *(Fransada və s.)*

**interior**² [ɪn'tɪərɪə^r] *adj* 1. daxili, iç; ~ **repairs** daxili təmir; **the ~ walls of a building** binanın daxili divarları; ~ **angle** *riyaz.* daxili bucaq; ~ **decoration** binanın daxili tərtibatı; ~ **decorator** daxili bəzəkçi *(evdə və s.)*; 2. ölkədaxili; ~ **trade** ölkədaxili ticarət

**interjection** [ˌɪntə'dʒekʃn] *n qram.* nida

**interlace** [ˌɪntə'leɪs] *v* 1. hörmək, toxumaq; birləşdirmək; **to ~ *smb.'s* hair with ribbons** bir kəsin saçını lentlə hörmək; 2. növbələşdirmək; növbələşmək

**interlacing** [ˌɪntə'leɪsɪŋ] *n* hörmə, hörülmə; toxuma, toxunma

**interlibrary** [ˌɪntə'laɪbrərɪ] *adj* kitabxanalararası; ~ **exchange** kitabxanalararası mübadilə

**interlingual** [ˌɪntə'lɪŋgwəl] *n dilç.* vasitəçi dil

**intermarriage** [ˌɪntə'mærɪdʒ] *n* 1. müxtəlif millət və ya irqə mənsub olan adamların evlənməsi; 2. *d.d.* qohumlar arasında nikah

**intermarry** [ˌɪntə'mærɪ] *v* 1. nikah vasitəsilə qohumlaşmaq; qarışmaq *(qəbilələr və ya irqlər haq.)*; 2. nikah bağlamaq, kəbin kəsdirmək *(qohumlar arasında)*

**intermeddle** [ˌɪntə'medl] *v* qarışmaq, müdaxilə etmək; **to ~ in *smb.'s* business** bir kəsin işinə qarışmaq/müdaxilə etmək, burnunu başqasının işinə soxmaq

**intermediary**¹ [ˌɪntə'mi:djərɪ] *n* 1. vasitəçi, araçı; dəllal; aradüzəldən; **to act as ~ for *smb.*** bir kəsin vasitəçisi olmaq, bir kəsin əvəzindən iş görmək; 2. vasitəçilik; 3. keçid forması və ya dövrü / mərhələsi

**intermediary**² [ˌɪntə'mi:djərɪ] *adj* 1. vasitəçilik, araçılıq; ~ **power** vasitəçi, araçı; aradüzəldən; dəllal; ~ **role** vasitəçilik rolu; ~ **role in a dispute** mübahisədə araçılıq rolu oynama; 2. aralıq; aradakı, aralıqdakı, ortadakı; keçid

**intermediate**¹ [ˌɪntə'mi:djət] *n* aradüzəldən, vasitəçi *(adam haq.)*

**intermediate**² [ˌɪntə'mi:djət] *adj* aralıq; ~ **stations** aralıq/kiçik stansiyalar; ~ **level** aralıq səviyyə; ~ **stage** aralıq mərhələ; *This train stops at a number of intermediate stations Bu qatar bir sıra kiçik stansiyalarda dayanır*

**interment** [ɪn'tə:mənt] *n* dəfn, dəfn etmə, basdırma *(meyiti)*

**interminable** [ˌɪntə'mɪnəbl] *adj* nəhayətsiz, sonsuz, intəhasız, hədsiz; uzun; əbədi, daimi, əbədi; ~ **discourse** sonsuz / nəhayətsiz söhbət; ~ **controversy** əbədi/daimi mübahisə; ~ **forests** ucsuz-bucaqsız meşələr

**interminably** [ˌɪntə'mɪnəblɪ] *adv* sonsuz / nəhayətsiz surətdə, intəhasız/sonsuz olaraq, son dərəcə; *The hours dragged on interminably Saatlar sonsuz dərəcədə uzandı*

**intermingle** [ˌɪntə'mɪŋgl] *v* qarışdırmaq, qatışdırmaq; qarışmaq; **to ~ colours** rəngləri / boyaları qarışdırmaq; *The waters of the streams met and intermingled Kiçik çayların suları qarşılaşdı və qarışdı; They intermingled in the crowd Onlar camaata / izdihama qarışdılar*

**intermission** [ˌɪntə'mɪʃn] *n* 1. fasilə, pauza; **without ~** fasiləsiz, ara vermədən, dayanmadan; 2. *amer.* antrakt; *There will be a short intermission at the end of Act 2 2-ci pərdənin sonunda qısa antrakt olacaq*

**intermittent** [ˌɪntə'mɪtənt] *adj* kəsilən, qırılan; qırıq-qırıq, kəsik-kəsik *(səs haq.)*, qeyri-müntəzəm işləyən, dayanan *(bir müddət)*; ~ **rain** qeyri-müntəzəm / gah kəsilən, gah yağan yağış; ~ **laughter** qırıq-qırıq gülüş; ~ **noise** qırıq-qırıq / gah gələn, gah kəsilən səs; ~ **current** *el.* qeyri-müntəzəm cərəyan; ~ **fever** qalxıb-düşən qızdırma; ~ **pulse** qeyri-müntəzəm vuran nəbz; ~ **pain** gah tutan, gah buraxan ağrı

**intermittently** [ˌɪntə'mɪtəntlɪ] *adv* kəsik-kəsik, qırıq-qırıq, fasilələrlə

**intern**¹ [ɪn'tə:n] *n amer.* tibb kollecinin tələbəsi və ya xəstəxanada işləyən və orada yaşayan gənc həkim

**intern**² [ɪn'tə:n] *v* 1. tərk-silah edib ölkə daxilində saxlamaq; **to ~ a warship/enemy citizens in time of war** müharibə zamanı/vaxtı hərbi gəmini/düşmən vətəndaşlarını tərk-silah edib ölkə daxilində saxlamaq; 2. tutmaq, həbs/dustaq etmək; təcrid etmək; **to ~ an insane person** ruhi xəstə adamı təcrid etmək

**internal** [ɪn'tə:nl] *adj* 1. daxili, iç; ~ **doors** daxili/iç qapılar; ~ **parts of a body** bədənin daxili orqanları; ~ **parts of the earth** torpağın/yerin təki, yeraltı sərvətlər; ~ **medicine** daxili xəstəliklərin terapiyası; ~ **bleeding** daxili qanaxma; ~ **trade** daxili ticarət; ~ **loans** daxili istiqrazlar; ~ **energy** *fiz.* daxili enerji; 2. gizli, məxfi; səmimi; ~ **thoughts** məxfi/səmimi fikirlər

**internally** [ɪn'tɜ:nəlɪ] *adv* **1.** içəridən, içərisindən, içəri tərəfdən, daxildən; **cold on the surface but hot** ~ üzdən soyuq içəridən isti; **2.** mənən, ruhən, mənəvi cəhətdən / cəhətcə; ~ **content** mənəvi cəhətdən razı / məmnun
**international**[1] [ɪntə'næʃnl] *n* **1.** beynəlxalq idman yarışlarının iştirakçısı; **2.** beynəlxalq yarış
**international**[2] [ɪntə'næʃnl] *adj* beynəlxalq; ~ **law/agreement/trade/conference** beynəlxalq qanun/müqavilə/ticarət/konfrans; ~ **peace** bütün dünyada sülh; ~ **copyright** beynəlxalq müəllif hüququ; ~ **games** *id.* beynəlxalq oyunlar; ~ **money** *mal. d.d.* qızıl; **International Peace Conference** Beynəlxalq Sülh Konfransı
**internationalism** [ˌɪntə:'næʃnəlɪzm] *n* beynəlmiləlçilik, internasionalizm
**internationalist** [ˌɪntə'næʃnəlɪst] *n* internasionalist, beynəlmiləlçi, internasionalizm tərəfdarı
**internationality** ['ɪntəˌnæʃ'nælɪtɪ] *n* beynəlmiləlçilik, beynəlmiləlçi xarakter/xüsusiyyət
**internationalization** ['ɪntəˌnæʃnəlaɪ'zeɪʃn] *n* beynəlmiləlləşdirmə
**internationalise** [ˌɪntə'næʃnəlaɪz] *v* = **internationalize**
**internationalize** [ˌɪntə'næʃnəlaɪz] *v* beynəlmiləlləşdirmək
**internationally** [ˌɪntə'næʃnəlɪ] *adv* beynəlmiləlçilik baxımından, müxtəlif dövlətlərin marağı baxımından
**internecine** [ˌɪntə'ni:saɪn] *adj:* **1.** ~ **war** daxili müharibə; **2.** ölümsaçan, öldürücü, məhvedici; qanlı; ~ **massacre** qanlı qırğın
**internist** [ɪn'tɜ:nɪst] *n* daxili xəstəliklər həkimi; terapevt, can həkimi
**interpenetrate** [ˌɪntə'penɪtreɪt] *v* qarşılıqlı təsir etmək; dərindən nüfuz etmək; *The two cultures, originally distinct, have so interpenetrated each other as to become virtually a single culture Mənşəcə fərqli olan bu iki mədəniyyət bir-birinə təsir göstərərək, əslində bir mədəniyyətə çevrilmişdir*
**interpenetration** ['ɪntəˌpenɪ'treɪʃn] *n* qarşılıqlı təsir / nüfuz etmə *(bir-birinə)*
**interpenetrative** [ˌɪntə'penɪtrətɪv] *adj* qarşılıqlı təsir / nüfuz edən
**interphone** ['ɪntəfoun] *n* daxili telefon
**interplanetary** [ˌɪntə'plænɪtrɪ] *adj* planetlərarası, planetlər arasında olan; ~ **space** planetlərarası fəza
**interplay** ['ɪntəpleɪ] *n* qarşılıqlı təsir, bir-birinə təsir; qarşılıqlı əlaqə / rabitə; **the** ~ **of plot and character** süjet və obraz arasında qarşılıqlı əlaqə
**interpret** [ɪn'tɜ:prɪt] *v* **1.** şərh/ izah / təfsir etmək, məna vermək; aydınlaşdırmaq; **to** ~ **a difficult text** çətin mətni izah/şərh etmək; **2.** yozmaq *(yuxunu)*; **to** ~ **a dream** yuxu yozmaq; **3.** anlamaq, başa düşmək; *I interpret his silence as consent Mən onun sükutunu razılıq kimi başa düşürəm*; **4.** dilmanclıq/tərcümə etmək *(şifahi)*; **to** ~ **for** *smb.* bir kəsə dilmanclıq etmək
**interpretation** [ɪnˌtɜ:prɪ'teɪʃn] *n* **1.** izah / şərh / təfsir etmə; izah, şərh, təfsir; başa salma; yozma; **the** ~ **of a dream** yuxunu yozma; **the** ~ **of a text** mətnin izahı/ şərhi/təfsiri; **to give different** ~**s of the same facts** eyni faktlara müxtəlif izahatlar / şərhlər vermək; **to put a wide** ~ **on** *smth.* bir şeyi geniş izah / şərh etmək; **2.** mənanı/ideyanı açıb göstərmə; **the** ~ **of a drama by the actors** dramın ideyasının aktyorlar tərəfindən açılıb göstərilməsi; **3.** tərcümə *(şifahi)*, dilmanclıq
**interpretative** [ɪn'tɜ:prɪtətɪv] *adj* izahedici, izah, aydınlaşdırıcı, şərhedici; **his** ~ **power** onun izahetmə/şərhetmə bacarığı
**interpreter** [ɪn'tɜ:prɪtə[r]] *n* **1.** dilmanc, tərcüməçi *(şifahi olaraq)*; **to carry on negotiations through an** ~ danışıqları dilmanc vasitəsilə aparmaq; **2.** təfsirçi, şərhçi, izahçı; yozan, yozucu; **an** ~ **of dreams** yuxuları yozan
**interracial** [ˌɪntə'reɪʃl] *adj* irqi qarışıqlıq, irqlərin qarışması; ~ **marriage** müxtəlif irqdən olanların evlənməsi /nikahı
**interregnum** [ˌɪntə'regnəm] *n (pl* **interregnums) 1.** səltənət fasiləsi *(monarxiya üsul-idarəsində: bir məmləkətin hökmdarsız qaldığı dövr)*; **2.** pauza, fasilə; **an** ~ **of consciousness** huşsuz vəziyyət
**interrelate** [ˌɪntərɪ'leɪt] *v (adət. məchulda işlədilir)* sıx surətdə əlaqədə/əlaqədar olmaq; *Many would say that crime and poverty are interlated Çoxları deyir ki, cinayət və yoxsulluq sıx surətdə əlaqədardır*
**interrelated** [ˌɪntərɪ'leɪtɪd] *adj* bir-birinə təsir edən, qarşılıqlı əlaqədə olan, əlaqələndirilmiş
**interrelation** [ˌɪntərɪ'leɪʃn] *n* **(of, between)** qarşılıqlı əlaqə / münasibət; münasibət; əlaqə, rabitə; **the** ~ **between wages and prices** əmək haqqları və qiymətlər arasında qarşılıqlı əlaqə
**interrelationship** [ˌɪntərɪ'leɪʃnʃɪp] *n* = **interrelation**
**interrogate** [ɪn'terəgeɪt] *v* **1.** soruşmaq, xəbər almaq; **2.** sual/sorğu-sual etmək; dindirmək, istintaq etmək; **to** ~ **a witness** şahidi dindirmək; **to** ~ **a prisoner** dustağı dindirmək / istintaq etmək; *He refused to be interrogated O, istintaqdan/dindirilmədən imtina etdi*
**interrogation** [ɪnˌterə'geɪʃn] *n* **1.** dindirmə, istintaq; sorğu-sual; **2.** sorğu, şifahi imtahan; **3.** sual; **point/note of** ~ sual işarəsi; **4.** *qram.* sual cümləsi
**interrogative** [ˌɪntə'rɔgətɪv] *adj* sual, sualedici, sualverici; **an** ~ **sentence** sual cümləsi; ~ **pronouns** sual əvəzlikləri; ~ **look** yalvarıcı baxış; **to give** *smb.* **an** ~ **look** bir kəsə yalvarıcı/sualedici nəzərlə baxmaq; *She gave me an interrogative look O, mənə yalvarıcı/sualedici nəzərlə baxdı*



**interrogatively** [ˌɪntə'rɔgətɪvlɪ] *adv* şübhə ilə, müəmmalı surətdə, yalvarıcı bir tərzdə; maraqla
**interrogator** [ɪn'terəgeɪtə[r]] *n* müstəntiq, silistçi; sorğu-sual aparan adam
**interrupt** [ˌɪntə'rʌpt] *v* **1.** kəsmək, dayandırmaq; qırmaq; sözünü kəsmək *(danışanın)*; **to** ~ **a lecture with a question** mühazirəni sual verməklə kəsmək; *Don't interrupt! Sözümü kəsmə!/kəsməyin!*; **2.** mane olmaq, pozmaq; **to** ~ *smb.'s* **sleep** bir kəsin yuxusunu pozmaq; *Don't interrupt me when I am busy Mən məşğul olanda mənə mane olma / olmayın*; **3.** qarışmaq, müdaxilə etmək *(söhbətə və s.)*; *He interrupted the conversation O, söhbətə qarışdı / müdaxilə etdi*
**interrupted** [ˌɪntə'rʌptɪd] *adj* kəsilmiş, arası kəsilmiş; pozulmuş, qırıq-qırıq, kəsik-kəsik; ~ **sleep** pozulmuş yuxu
**interruptedly** [ˌɪntə'rʌptɪdlɪ] *adv* fasilələrlə, qırıq-qırıq, kəsik-kəsik
**interruption** [ˌɪntə'rʌpʃn] *n* **1.** fasilə, tənəffüs, dayandırma, saxlama; **to work with** ~**s** fasilələrlə işləmək; **to speak without** ~ fasiləsiz/dayanmadan danışmaq; *She spoke for two hours without interruption O, fasiləsiz olaraq iki saat danışdı*; **2.** müdaxilə etmə, qarışma; *Your interruption is pardonable Sənin/Sizin müdaxilə etmən/etməniz bağışlana bilər*; **3.** kəsmə, pozma; manco; ~ **of telephone communication** telefon əlaqəsinin kəsilməsi; **to meet with many** ~**s** çoxlu manеələrlə qarşılaşmaq/rastlaşmaq
**intersect** [ˌɪntə'sekt] *v* **1.** kəsmək; kəsib keçmək, iki/ikiyə bölmək; *The path intersects the field Cığır/Yol tarlanı iki bölür*; **2.** kəsişmək; *The line AB intersects the line CD AB xətti CD xətti ilə kəsişir*
**intersection** [ˌɪntə'sekʃn] *n* **1.** kəsişmə; **motorway** ~**s** avtomagistralın kəsişmələri; **2.** *riyaz.* kəsişmə nöqtəsi və ya xətti; **the angle of** ~ kəsişmə bucağı
**intersperse** [ˌɪntə'spɜ:s] *v* **1.** səpələmək; səpmək; **red tulips** ~**d among the yellow** sarı qərənfillər arasında səpələnmiş qırmızı qərənfillər; **2.** bəzəmək, müxtəlifləşdirmək; **to** ~ **a book with pictures** kitabı şəkillərlə bəzəmək
**interstate** [ˌɪntə'steɪt] *adj amer.* ştatlararası; ~ **tensions/commerce/highways** ştatlararası gərginlik/ ticarət/şosse yolları
**interstellar** [ˌɪntə'stelə[r]] *adj* ulduzlararası; ~ **space** ulduzlararası fəza; ~ **spaceship** kosmik gəmi
**interstice** [ɪn'tɜ:stɪs] *n* ara, aralıq; dar keçid; çatlaq, çat, yarıq; **an** ~ **in the wall** divarda çat / çatlaq
**interwine** [ˌɪntə'waɪn] *v* **1.** hörmək, toxumaq; **to** ~ **flowers in a garland** çiçəklərdən çələng hörmək; **2.** hörülmək, toxunmaq; **3.** dolaşmaq, dolaşıq düşmək, pırtlaşmaq, burulmaq, eşilmək
**interwist** [ˌɪntə'twɪst] *v* burmaq, eşmək, dolamaq, sarımaq; dolaşdırmaq, pırtlaşdırmaq, dolaşıq salmaq
**interval** ['ɪntəvl] *n* **1.** ara, aralıq; məsafə; fasilə, interval; ~ **between two trees** iki ağac arasında məsafə; *The trees were planted at 6 metre intervals Ağaclar hər 6 metrdən bir əkilmişdi*; ~ **between hills** təpələr arasında məsafə; **at short /long** ~**s** uzun/qısa fasilələrlə; **a minute's** ~ bir dəqiqəlik fasilə; **a week's** ~, **an** ~ **of a week** bir həftəlik fasilə; **at** ~**s of an hour** hər saatdan bir; **to see** *one's* **friends at** ~**s** dostlarını vaxtaşırı/hərdənbir görmək; **without** ~**s** fasiləsiz, durmadan, dayanmadan, arası kəsilmədən; **2.** tənəffüs; **an** ~ **between two lessons** iki dərs arasında tənəffüs; **in the** ~ tənəffüs vaxtı/zamanı; **major/minor** ~ böyük/kiçik tənəffüs; **3.** antrakt; *There will be an interval of 20 minutes after the second act İkinci pərdədən sonra 20 dəqiqəlik antrakt olacaq*; **4.** sükut, pauza; **an** ~ **of silence to show respect for the dead** ölənlərin xatirəsinə sükut; **5.** *mus.* interval; **an** ~ **of one octave** bir oktavanın intervalı
**intervene** [ˌɪntə'vi:n] *v* **1.** olmaq, baş vermək, vaqe olmaq, əmələ gəlmək; *Some argument had intervened between them Onların arasında mübahisə oldu/baş verdi*; **2.** qarışmaq, müdaxilə etmək; **to** ~ **to settle a quarrel** mübahisəni kəsmək üçün vasitəçilik etmək/araya girmək; **to** ~ **in a dispute** mübahisəyə qarışmaq/ müdaxilə etmək; **3.** mane olmaq, maneçilik törətmək; *I'll come if nothing intervenes Əgər bir şey mane olmasa, gələcəm*; **4.** yerləşmək; *The Mediterranean intervenes between Europe and Africa Aralıq dənizi Avropa ilə Afrikanın arasında yerləşir*
**intervention** [ˌɪntə'venʃn] *n* qarışma, müdaxilə, müdaxilə etmə; vasitəçilik; **surgical** ~ cərrahiyyə müdaxiləsi; **direct/ official** ~ bilavasitə/rəsmi müdaxilə etmə; **to be opposed to the** ~ **of a third person** üçüncü şəxsin müdaxiləsinə etiraz etmək; **armed** ~ silahlı müdaxilə; **military** ~ hərbi müdaxilə
**interview**[1] ['ɪntəvju:] *n* intervyu, müsahibə söhbət; **to have an** ~ **with** *smb.* bir kəsdən intervyu /müsahibə almaq; **to ask/to request/to obtain an** ~ intervyu almaq üçün xahiş etmək; **to grant an** ~ intervyu/müsahibə vermək; **to refuse to give an** ~ **to a journalist** jurnalistə intervyu verməkdən imtina etmək/boyun qaçırmaq
**interview**[2] ['ɪntəvju:] *v* intervyu/müsahibə almaq, söhbət etmək/aparmaq
**interviewee** [ˌɪntəvju:'i:] *n* intervyu verən
**interviewer** ['ɪntəvju:ə[r]] *n* intervyu alan/ aparan
**interwar** [ˌɪntə'wɔ:[r]] *adj* müharibələrarası *(xüs. I və II dünya müharibələri haq.)*; **the** ~ **period** müharibələrarası müddət/dövr
**interwork** [ˌɪntə'wɜ:k] *v (pt, pp* **inter- wrought,**

interworked [-t-]) qarşılıqlı təsir göstərmək, bir-birinə təsir etmək
**intestacy** [ɪn'testəsɪ] *n hüq.* 1. vəsiyyətin olmaması; 2. qanuna görə varisə çatacaq əmlak
**intestate** ['ɪntestɪt] *adj hüq.* vəsiyyət etmədən ölən
**intestinal** [ɪn'testɪnl] *adj* bağırsaq; ~ **worm** bağırsaq qurdu; ~ **colic** bağırsaq sancısı
**intestine** [ɪn'testɪn] *n anat. (adət. pl)* bağırsaq; **small/large** ~ nazik / yoğun bağırsaq
**intimacy** ['ɪntɪməsɪ] *n* 1. yaxın əlaqə, yaxınlıq, məhrəmlik, dostluq; **to be one of** ***smb.'s*** ~ bir kəsin yaxın dostu olmaq; **to live in close ~ with** ***smb.*** bir kəslə yaxın əlaqədə olmaq; 2. seksual / cinsi əlaqə
**intimate**[1] ['ɪntɪmɪt] *adj* 1. dərin; sirrli, gizli, məxfi, gizli saxlanılan; ~ **secrets** gizli/ məxfi sirrlər; ~ **thoughts** gizli/məxfi fikirlər; 2. daxili; **the ~ structure of matter** maddənin daxili quruluşu; **an ~ independence between things** şeylər arasında daxili qarşılıqlı asılılıq; 3. yaxın, səmimi; ~ **friends** yaxın/səmimi dostlar; **to be** ***smb.'s*** **~ friend** bir kəsin yaxın/ səmimi dostu olmaq; **to establish ~ relations with** ***smb.*** bir kəslə səmimi əlaqə yaratmaq; 4. məhəbbət, aşiqanə; ~ **connection** məhəbbət/aşiqanə əlaqə; ~ **letters** məhəbbət/sevgi məktubları; **to be ~ with** ***smb.***, **to be on ~ terms with** ***smb.*** bir kəslə yaxın/intim əlaqədə olmaq; 5. şəxsi; **an ~ diary** şəxsi gündəlik; 6. ətraflı, dərin, əsaslı; **to have an ~ knowledge of** ***smth.*** bir şey haqqında ətraflı /dərin/əsaslı biliyə malik olmaq
**intimate**[2] ['ɪntɪmeɪt] *v* 1. işarə etmək, söz atmaq; eyhamla danışmaq, eyham vurmaq; güman/fərz etmək, nəzərdə tutmaq; **to ~** ***one's*** **intention of doing** ***smth.*** bir şey etmək üçün öz niyyətini eyhamla bildirmək; **to ~** ***smth.*** **to** ***one's*** **hearers** öz dinləyicilərinə bir şey haqqında eyham vurmaq; **to express one thing and ~ another** bir şeyi demək, lakin başqa şeyi fərz etmək/nəzərdə tutmaq; 2. *amer.* rəsmi olaraq elan etmək, xəbər vermək, bildirmək; **to ~** ***smth.*** **to** ***smb.*** bir kəsə bir şey haqqında xəbər vermək; **to ~ open war against** ***smb.*** bir kəsə açıq müharibə elan etmək
**intimation** [.ɪntɪ'meɪʃn] *n* 1. işarə, eyham, him; iz, əlamət; *He has given us no intimation of his intentions O, öz niyyətləri haqqında bizə heç bir eyham vurmayıb;* 2. elan etmə, bildirmə, elan; göstəriş, təklif, təklif etmə
**intimidate** [ɪn'tɪmɪdeɪt] *v* qorxutmaq, hədələmək; qara-qorxu / hədə-qorxu gəlmək; **to ~ a witness into silence** susmaq üçün şahidi qorxutmaq
**intimidation** [ɪn.tɪmɪ'deɪʃn] *n* qorxutma, hədə, qorxu, hədə-qorxu, şantaj etmə, şantaj; **to keep** ***smb.*** **from** ***smth.*** **by ~** hədə/qorxu vasitəsilə bir kəsi bir şeydən çəkindirmək; **"Intimidations"** "Mətbuat rubrikası" *(qəzetdə)*
**intimidatory** [ɪn.tɪmɪ'deɪtərɪ] *adj* qorxudan, vahiməyə / qorxuya salan, şantaj edən
**into** *qüvvətli forması:* [ɪntu:]; *saitlərdən əvvəl:* ['ɪntə] *prep* 1. *Azərbaycan türkcəsində bir qayda olaraq* **-a, -ə, -ya, -yə** + *yönlük hal şəkilçiləri və yaxud iç + yönlük hal şəkilçisinə uyğun gəlir: Let's go into the garden Gəl/Gəlin bağa gedək; The river flows into the lake Çay gölə tökülür; Put the pencils into the box Karandaşları qutuya/qutunun* ***içinə*** *qoy/ qoyun;* **to get ~ trouble** bəlaya düşmək/ düçar olmaq; **to get ~ difficulties** çətinliyə düşmək; **to fall ~ a trap** tələyə düşmək; **to fall ~ the hands of the enemy** düşmən əlinə düşmək; **to translate from English ~ French** ingilis dilindən fransız dilinə tərcümə etmək; 2. *Bəzi hallarda* **into** *Azərbaycan türkcəsinə tərcümə edilmir: məs.* **to cut** ***smth.*** **~ pieces** bir şeyi tikə-tikə / parça-parça kəsmək; *She folded the handkerchief into four O, əl yaylığını dörd qatladı*
**intolerable** [ɪn'tɔlərəbl] *adj* dözülməz, qatlaşılmaz; çox ağır/pis; ~ **heat/cold/ pain/insolence/noise** dözülməz isti/soyuq /ağrı/həyasızlıq/səs
**intolerably** [ɪn'tɔlərəblɪ] *adv* dözülməz dərəcədə/surətdə, qatlaşılmaz dərəcədə, son dərəcə bərk/şiddətli; ~ **rude** dözülməz dərəcədə qaba/kobud
**intolerance** [ɪn'tɔlərəns] *n* 1. dözülməzlik; yolverilməzlik; **religious** ~ dini dözülməzlik; 2. dözümsüzlük; dözümsüzlük göstərmə *(bir şeyə qarşı);* **to accuse** ***smb.*** **of ~** bir kəsi dözümsüzlükdə ittiham etmək; ~ **of pain** ağrıya dözümsüzlük göstərmə
**intolerant** [ɪn'tɔlərənt] *adj* 1. dözülməz, dözülməyən; **an ~ nature** dözülməz xarakter *(xasiyyət);* 2. dözməyən, tab gətirməyən; **flowers ~ of shade** kölgəyə dözməyən *(yəni solan)* çiçəklər
**intonation** [.ɪntə'neɪʃn] *n* intonasiya *(səs tonunun ucalıb alçalması);* **rising** ~ qalxan intonasiya; **falling** ~ düşən intonasiya; *In English general questions have rising but special questions falling intonation İngilis dilində ümumi suallar qalxan, xüsusi suallar isə düşən tona malikdir*
**intone** [ɪn'toun] *v* 1. intonasiya ilə ifa etmək *(oxumaq, çalmaq, deklamasiya demək);* 2. *mus.* modullaşmaq *(bir tondan başqasına keçmək);* 3. başlamaq *(xoru, nəğməni)*
**in toto** [ɪn'toutou] *adv* bütövlükdə, tam olaraq; *You must accept the proposal in toto or not at all Sən/Siz təklifi ya bütövlükdə qəbul etməlisən/etməlisiniz, ya da heç qəbul etməməlisən/etməməlisiniz*
**intoxicant** [ɪn'tɔksɪkənt] *n* keflendirici/ sərxoşedici içki; **to act as an ~** kefli/ sərxoş kimi hərəkət etmək
**intoxicate** [ɪn'tɔksɪkeɪt] *v* 1. keflənmək/ sərxoş olana qədər içmək; 2. *məc.* sərxoş /məst olmaq; **to be ~d with/by success** müvəffəqiyyətdən məst olmaq; 3. *tib.* zəhərləmək, zəhər/ağı vermək



**intoxicated** [ɪn'tɔksɪkeɪtɪd] *adj* 1. kefli, sərxoş; *He was arrested for driving while intoxicated Sərxoş halda maşın sürdüyü üçün onu həbs etdilər;* 2. həyəcanlı; məst, sərxoş; ~ **by success** müvəffəqiyyətdən sərxoş/məst olmuş
**intoxicating** [ɪn'tɔksɪkeɪtɪŋ] *adj* keflendirici, sərxoşedici, məstedici; **the ~ effect of alcohol** spirtli içkinin keflendirici təsiri; **the ~ scent of fields and woodlands** çöllərin və meşəliklərin məstedici rayihəsi / ətri
**intoxication** [ɪn.tɔksɪ'keɪʃn] *n* 1. keflənmə, sərxoş/kefli/məst olma; sərxoşluq, keflilik, məstlik; 2. *tib.* zəhərlənmə
**intra-** ['ɪntrə-] *pref Termin xüsusiyyətli sifətlər düzəltmək üçün işlədilir; Azərbaycan türkcəsində* **-daxili** *komponentinə uyğun gəlir:* **intracranial** kəllə**daxili**; **intranuclear** atom**daxili**; **intraurban** şəhər**daxili**
**intra-atomic** [.ɪntrəə'tɔmɪk] *adj fiz.* atomdaxili
**intracranial** [.ɪntrə'kreɪnjəl] *adj anat.* kəllədaxili
**intractability** [ɪn.træktə'bɪlɪtɪ] *n* 1. tərslik, inad, inadkarlıq, inadcıllıq, kəclik; 2. yolagetməzlik, höcətlik
**intractable** [ɪn'træktəbl] *adj* 1. tərs, inadkar, höcət; yolagetməz; ~ **child** tərs /yolagetməz /inadcıl uşaq; 2. çətin, həllolunmaz; ~ **problem** çətin/həllolunmaz problem; 3. çətinsağalan, çətin müalicə olunan; **an ~ malady** çətin müalicə olunan xəstəlik; **an ~ pain** aradan qaldırıla bilməyən ağrı
**intractably** [ɪn'træktəblɪ] *adv* inadla, tərsliklə, tərs-tərs
**intramural** ['ɪntrə'mjuərəl] *adj* bir bina/ kollec və s. daxilində baş verən; şəhərdaxili; kollecdaxili; **an ~ games** şəhərdaxili oyunlar; **~ courses at a college** kollecdaxili kurslar
**intransigence** [ɪn'trænsɪdʒəns] *n* barışmazlıq; möhkəmlik, əyilməzlik, yenilməzlik, sarsılmazlıq, mətanət
**intransigent** [ɪn'trænsɪdʒənt] *adj* barışmaz; dayanıqlı, mətanətli, yenilməz, fikrindən dönməyən, kompromisə getməyən/gəlməyən, barışmayan; **~ attitude** barışmaz münasibət
**intransitive** [ɪn'trænsətɪv] *adj qram.* təsirsiz *(fel haq.);* **~ verbs** təsirsiz fellər; ***To go, to sleep, to die are intransitive verbs To go, to sleep, to die*** *təsirsiz fellərdir*
**intranuclear** [.ɪntrə'nju:klɪə^r] *adj fiz.* nüvədaxili
**intra-ocular** [.ɪntrə'ɔkjulə^r] *adj tib.* gözdaxili; **~ tension/pressure** gözdaxili təzyiq
**intra-uterine** [.ɪntrə'ju:tərɑɪn] *adj tib.* uşaqlıqdaxili
**intravenous** [.ɪntrə'vɪ:nəs] *adj* venadaxili; **an ~ injection** venadaxili iynə vurma
**intrepid** [ɪn'trepɪd] *adj* cürətli, cəsur, qorxubilməz, qorxu bilməyən, qorxmaz, qoçaq, cəsarətli, igid; **an ~ soldier** cəsur/ qoçaq/igid/qorxubilməz əsgər; **an ~ explorer** cürətli/cəsur tədqiqatçı
**intrepidity** [.ɪntrɪ'pɪdɪtɪ] *n* cürətlilik, qorxmazlıq, igidlik, cəsurluq, qoçaqlıq
**intrepidly** [ɪn'trepɪdlɪ] *adv* qorxmadan, çəkinmədən, cəsarətlə, qoçaqlıqla, mərdliklə, cürətlə, qorxu bilmədən
**intricacy** ['ɪntrɪkəsɪ] *n* 1. dolaşıqlıq, qarışıqlıq, mürəkkəblik, çəlpəşiklik; çətinlik, ağırlıq; **the ~ of a path** yolun/cığırın çətinliyi/dolaşıqlığı; **the ~ of a plot** süjetin dolaşıqlığı/qarışıqlığı; **~ of form** formanın mürəkkəbliyi; *The plan was full of intricacies Plan dolaşıqlıqlarla dolu idi;* 2. labirint *(dolanbac);* **a long ~ of a passage** keçidin uzun dolanbacları
**intricate**[1] ['ɪntrɪkɪt] *adj* dolaşıq, qarışıq, pırtlaşıq, mürəkkəb, müəmmalı, çəlpəşik, çətin anlaşılan; müşkül; **~ system** dolaşıq/mürəkkəb sistem; **~ plot** çətin anlaşılan/dolaşıq süjet; **~ directions** qarışıq/ çətin anlaşılan göstərişlər; **an ~ problem** dolaşıq/qarışıq/mürəkkəb/çətin anlaşılan problem
**intricate**[2] ['ɪntrɪkeɪt] *v* dolaşdırmaq, çətinləşdirmək, mürəkkəbləşdirmək
**intrigue**[1] [ɪn'tri:g] *n* 1. intriqa, fitnə, fəsad; hiylə; **political ~s** siyasi intriqalar/hiylələr; **clandestine ~** gizli intriqa/fitnə/hiylə; **to meddle with ~** intriqaya qoşulmaq/ qarışmaq; **to plunge into ~, to fall into ~** intriqa ilə məşğul olmaq, intriqa yaratmaq; **to share in ~** intriqada iştirak etmək; 2. məhəbbət əlaqəsi, eşqbazlıq; 3. süjet, süjet xətti *(romanda, dramda: hadisələrin inkişafı)*
**intrigue**[2] [ɪn'tri:g] *v* 1. intriqa salmaq/ aparmaq; **to ~ against** ***smb.*** bir kəsə qarşı intriqa aparmaq; 2. maraqlandırmaq, maraq oyatmaq/yaratmaq; *The children were intrigued by/with the new toy Uşaqlar təzə oyuncaqla maraqlandılar. Təzə oyuncaq uşaqları maraqlandırdı*
**intriguer** [ɪn'tri:gə^r] *n* intriqan, intriqaçı, fitnəçi, fitnəkar, fəsadçı, iblis; bic adam
**intriguery** [ɪn'tri:gərɪ] *n* intriqanlıq, fitnəçilik, fitnəkarlıq, fəsadçılıq
**intriguing** [ɪn'tri:gɪŋ] *adj* 1. maraqlandırıcı, maraq doğuran/yaradan/oyadan, marağa səbəb olan; **an ~ piece of news** maraq doğuran/yaradan xəbər; 2. maraqlı, əyləncəli
**intriguingly** [ɪn'tri:gɪŋlɪ] *adv* 1. intriqa vasitəsilə/yolu ilə; 2. maraq doğuracaq/qəribə bir tərzdə; *Intriguingly, the stranger kept his face hidden Yad adam üzünü qəribə bir tərzdə gizlətdi*
**intrinsic** [ɪn'trɪnsɪk] *adj* 1. əsl, həqiqi; doğru; **the ~ meaning** əsl/həqiqi məna; **a person's ~ worth** adamın əsl/həqiqi mahiyyəti; **~ character** anadangəlmə xarakter/xasiyyət; **the ~ value of gold** qızılın həqiqi dəyəri; 2. xas olan; **beauty ~ to** ***smb./smth.*** bir kəsə/şeyə xas olan gözəllik; 3. *anat.* daxili; **~ pressure** daxili təzyiq

**intrinsically** [ɪn'trɪnsɪkəlɪ] *adv* həqiqətdə, əslində, mahiyyət etibarilə; **a thing ~ evil** əslində/mahiyyətcə qüsurlu şey

**introduce** [ˌɪntrə'dju:s] *v* **1.** *(içəri)* salmaq, yeritmək; qoymaq, yerləşdirmək *(bir şeyin içinə)*; **to ~ a tube into a wound** yaranın içinə boru yeritmək/salmaq; **to ~ a key into a lock** qıfıla açar salmaq; **2.** daxil etmək, gətirmək; **to ~ a romantic situation into a novel** romana romantik situasiya daxil etmək; **to ~ a person into a room/house/family** bir şəxsi otağa/evə/ailəyə gətirmək; *He was introduced into the Cabinet Onu Kabinetin tərkibinə daxil etdilər*; **3.** işlətmək; tətbiq etmək; **to ~ a new word** yeni söz işlətmək; **to ~ a new fashion/method/rule** yeni dəb/ metod/qayda tətbiq etmək; **4.** müzakirəyə çıxartmaq *(qanun layihəsini və s.)*; **to ~ a bill into Congress** qanun layihəsini konqresin müzakirəsinə çıxartmaq; **to ~ a question for debate** məsələni müzakirəyə çıxartmaq/qoymaq; **5.** təqdim/tanış etmək; **to ~ one person to another** bir şəxsi digər bir kəslə tanış etmək; *Allow me to introduce my friend to you İcazə ver/verin, dostumu səninlə/sizinlə tanış edim; Let me introduce myself - I'm Helen Robinson İcazə ver/verin, özümü təqdim edim - Mən Helen Robinsonam; The chair introduced the speaker to the audience Sədr natiqi dinləyicilərə təqdim etdi*; **to ~ the subject of conversation** söhbətin mövzusu ilə tanış etmək; **to ~ readers to a poem** oxucunu şerlə/poema ilə tanış etmək; **6.** başlamaq; *He introduced his speech with a joke O, nitqini zarafatla başladı*

**introduction** [ˌɪntrə'dʌkʃn] *n* **1.** təqdim etmə *(rəsmi)*, tanışlıq; *Once the introduction was over, we got straight down to business Tanışlıq qurtaran kimi biz o saat işə başladıq*; **2.** müqəddimə, giriş; giriş sözü; **a short/general ~** qısa/ümumi giriş; **to write an ~ to a book** kitaba giriş/ müqəddimə yazmaq; **an ~ to Astronomy /Linguistics/Chemistry, *etc.*** astronomiyaya/dilçiliyə/kimyaya giriş; **to deliver ~** giriş sözü demək; **3.** daxil etmə *(tərkibə)*; **foreign borrowings of recent ~** bu yaxınlarda alınmış xarici sözlər; **4.** yenilik; *Radios are a later introduction than telephones Radio telefondan sonrakı yenilikdir*

**introductory** [ˌɪntrə'dʌktərɪ] *adj* giriş; **~ chapter** giriş fəsli; **~ course** giriş kursu

**introvert**[1] ['ɪntrəvə:t] *n* öz aləminə qapılmış adam, öz maraqları haqqında düşünən, özgələrə biganə qalan adam

**introvert**[2] [ˌɪntrə'və:t] *v* öz aləminə qapılmaq

**intrude** [ɪn'tru:d] *v* **1.** qarışmaq, müdaxilə etmək; **to ~ into *smb.'s* private grief** bir kəsin şəxsi kədərinə qarışmaq/şərik olmaq; *I'm sorry to intrude, but could I talk to you for a moment? Müdaxilə etdiyim üçün üzr istəyirəm, səninlə/sizinlə bir dəqiqə danışmaq olarmı?*; **2.** pozmaq; **to ~ upon *smb.'s* leisure** bir kəsin istirahətini pozmaq; **3.** mane olmaq; *I hope I am not intruding Ümid edirəm ki, sənə/sizə mane olmuram*; **4.** vadar etmək, zorla qəbul etdirmək /boynuna qoymaq; çətinə /zəhmətə salmaq *(bir kəsi)*; **to ~ *one's* views /*one's* opinions upon *smb.*** öz fikirlərini /baxışlarını bir kəsə zorla qəbul etdirmək; **5.** boğaza keçmək, zəhlə tökmək, əl çəkməmək, özünü araya soxmaq

**intruder** [ɪn'tru:də^r] *n* **1.** zəhlə tökən/aparan adam, sırtıq adam; çağırılmamış qonaq; **2.** *hüq.* özgənin əmlakını yaxud hüququnu mənimsəmiş adam; yalançı, fırıldaqçı *(başqasının adını mənimsəyən)*

**intrusion** [ɪn'tru:ʒn] *n* **1.** müdaxilə, müdaxilə etmə, qarışma; zorla girmə; dəvətsiz gəlmə; **unpardonable ~** bağışlanılmaz müdaxilə; **2.** qəsd, qəsd etmə, əl uzatma; pozma; **an ~ upon *smb.'s* privacy** bir kəsin tənhalığını pozma; **3.** zorla boynuna qoyma/qəbul etdirmə, vadar etmə; **the ~ of *one's* opinion upon another** öz fikrini /rəyini zorla başqasına qəbul etdirmə

**intrusive** [ɪn'tru:sɪv] *adj* **1.** qarışan, müdaxilə edən; çağırılmamış; **2.** zəhlətökən, təngə gətirən, bezikdirən, usandırıcı, qarayaxa, sırtıq; darıxdırıcı; **~ neighbours/ journalists** zəhlətökən qonşular/jurnalistlər

**intuit** [ɪn'tju:ɪt] *v* intuisiya ilə bilmək/dərk etmək

**intuition** [ˌɪntju'ɪʃn] *n* **1.** intuisiya, duyğu, duyma, sezmə, ürəyə damma; **to be guided by ~** intuisiyaya əsaslanmaq, intuisiyanı əldə rəhbər tutmaq; **to have great powers of ~** yaxşı inkişaf etmiş intuisiyaya malik olmaq; **2.** intuisiyaya əsaslanan bilik

**intuitive** [ɪn'tju:ɪtɪv] *adj* **1.** intuitiv; intuisiyaya əsaslanan; **~ knowledge** intuitiv / intuisiyaya əsaslanan bilik; **2.** intuisiyaya malik olan; *Are women more intuitive than men? Qadınlarda intuisiya kişilərdən güclüdürmü?*

**intuitively** [ɪn'tju:ɪtɪvlɪ] *adv* intuitiv olaraq; *Intuitively, she knew where to find the man İntuitiv olaraq o, kişinin harada olduğunu bilirdi*

**inundate** ['ɪnʌndeɪt] *v* **1.** basmaq, daşıb basmaq; *The river burst its banks and inundated nearby villages Çay sahillərini aşaraq yaxın kəndləri basdı*; **2.** *məc.* doldurmaq; tökmək, töküb doldurmaq; **to be ~d with letters/invitations** üstünə məktublar/dəvətlər yağdırılmaq; *We were inundated with questions Bizim üstümüzə sual yağdırdılar*

**inundation** [ˌɪnʌn'deɪʃn] *n* **1.** basma, daşma, sel; **the ~ of low-laying land** selin düzən yerləri basması; **2.** axın; **an ~ of tourists** turist axını

**inure** [ɪ'nju:ə^r] *v* **1.** öyrətmək, alışdırmaq, öyrəşdirmək; **to ~ the body to cold** bədəni soyuğa öyrətmək/alışdırmaq; **to ~ the body to heat** bədəni istiyə öyrətmək /öyrəşdirmək/alışdırmaq; **to be ~d to hardships** özünü ağır zəhmətə alışdırmaq; *After living here for years I've become inured to the damp climate Bir neçə il burada yaşadıqdan sonra mən rütubətli havaya alışmışam/öyrəşmişəm*; **2.** *hüq.* qüvvəyə minmək, hüquqi qüvvəyə malik olmaq, təsir etmək; **to ~ to *smb.'s* benefit** bir kəsin xeyrinə olmaq, bir kəsə xeyir gətirmək



**invade** [ɪn'veɪd] *v* **1.** zəbt/istila/işğal/qəsb etmək, tutmaq; güclə/güc vasitəsilə əldə etmək; **to ~ a country** ölkəni zəbt/istila/ işğal etmək; **2.** hücum çəkmək, doldurmaq, axışıb gəlmək, tökülüşmək *(camaat və s. haq.)*; *Tourists invaded the city Turistlər şəhərə axışıb töküldülər; Grasshoppers invaded the fields Çəyirtkələr zəmilərə/tarlalara hücum çəkdilər*; **3.** bürümək, çulğamaq *(hiss haq.)*; *A sense of loneliness invaded her Tənhalıq hissi onu bürüdü/çulğadı*; **4.** qəsd etmək, əl uzatmaq/atmaq; **to ~ another person's rights** başqa adamın hüquqlarına əl uzatmaq; **5.** zərbə vurmaq /endirmək, yaralamaq; yayılmaq *(xəstəlik haq.)*; *Gangrene invades the healthy tissue Qanqrena sağlam toxumanı zədələyir*

**invader** [ɪn'veɪdə^r] *n* işğalçı, istilaçı, qəsbkar

**invalid**[1] ['ɪnvəlɪd] *n* əlil, şikəst, çolaq, şil; xəstə; **a resort of/for ~s** əlillər/xəstələr üçün kurort; *He has been an invalid all his life O, ömrü boyu əlil/şikəst olub*

**invalid**[2] ['ɪnvəlɪd] *adj* **1.** əlil, şikəst, çolaq, şil; xəstə; əmək iqtidarı/qabiliyyəti olmayan; əmək qabiliyyətini itirmiş; xəstə; **~ home** əlillər evi /üçün ev; **her ~ mother** onun əlil/şikəst /xəstə anası; **an ~ chair** əlillər üçün araba, əlil arabası; **2.** rəsmi olaraq qəbul edilməyən, saxta; **an ~ passport** saxta pasport; **an ~ will** saxta vəsiyyət; **3.** yalan, əsaslandırılmamış, əsassız, məntiqsiz; **an ~ argument/ statement** yalan bəyanat

**invalid**[3] ['ɪnvəlɪd] *v* **1.** şikəst/əlil/çolaq etmək; **2.** xəstələnmək, əlil/şikəst/çolaq olmaq; əmək qabiliyyətini itirmək; **3.** xəstəliyə görə hərbi xidmətdən azad etmək; *He was invalided home Xəstəliyinə görə onu hərbi xidmətdən azad etdilər; He was invalided out of the army Xəstəliyinə görə onu ordudan tərxis etdilər*

**invalidate** [ɪn'vælɪdeɪt] *v* **1.** yararsız/əsassız/əmək qabiliyyətsiz hesab etmək; **to ~ evidence** sübutu əsassız hesab etmək; **2.** *hüq.* qanuni gücündən salmaq; qüvvəsini itirmiş hesab etmək *(sənəd və s. haq.)*; **to ~ an agreement** sazişi etibarsız hesab etmək; **3.** təsdiqdən imtina etmək, ləğv etmək *(seçkinin nəticəsini və s.)*

**invalidation** [ɪnˌvə'lɪdeɪʃn] *n hüq.* qanuni qüvvəsindən salma, ləğv etmə

**invalidity**[1] [ˌɪnvə'lɪdɪtɪ] *n* **1.** əlillik, şikəstlik, çolaqlıq, şillik; **2.** etibarsız olma, qanuni qüvvəsi olmama, qüvvəsini itirmə; **the ~ of their passports** onların pasportunun qüvvəsinin itirməsi/etibarsız olması; **the ~ of the evidence** ifadənin/sübutun əsassızlığı; **the ~ of their marriage** onların kəbininin qanunsuzluğu

**invalidity**[2] [ˌɪnvə'lɪdɪtɪ] *adj* şikəstlik, əlillik; **an ~ pension** əlillik təqaüdü

**invalidly** [ɪn'vælɪdlɪ] *adv* qeyri-qanuni, qanunsuz olaraq

**invalidness** [ɪn'vælɪdnɪs] *n* = **invalidity**

**invaluable** [ɪn'væljuəbl] *adj* qiymətə gəlməz, son dərəcə qiymətli, misli-bərabəri olmayan; **~ help/advice/information** son dərəcə qiymətli kömək/məsləhət/xəbər; *This book will be invaluable to/for all students of history Bu kitab tarix öyrənən bütün tələbələr üçün çox qiymətli olacaq*

**invariability** [ɪnˌveərɪə'bɪlɪtɪ] *n* sabitlik, daimilik, dəyişməzlik; sədaqət

**invariable** [ɪn'veərɪəbl] *adj* sabit, dəyişməz, dəyişməyən, daimi; sədaqətli, vəfalı; **~ temperature** sabit/dəyişməz temperatur

**invariably** [ɪn'veərɪəblɪ] *adv* həmişə, daim, adətən, hər vaxt/dəfə; *She invariably comes late O, həmişə gec gəlir*

**invasion** [ɪn'veɪʒn] *n* **1.** hücum, soxulma, basqın, yürüş; **the ~ of Britain** Britaniyanın hücumu /basqını; **2.** axın; **an ~ of tourists** turistlərin axını; **3.** qarışma, müdaxilə etmə; **an ~ of *one's* privacy** bir kəsin şəxsi tənhalığının pozulması

**invasive** [ɪn'veɪsɪv] *adj* **1.** işğalçılıq, qəsbkarlıq, istilaçılıq; **~ war** işğalçılıq müharibəsi; **2.** yayılma meylli, yayılan; **~ cancer cells** yayılma meylli xərçəng toxumaları; **~ smells** yayılan iylər

**invective** [ɪn'vektɪv] *n* **1.** təhqir, təhqiredici nitq; düşməncəsinə çıxış; **speech filled with ~s** təhqirlə dolu nitq; **2.** söyüş, söymə; **a torrent/a stream of ~s** güclü söyüş yağdırma; **to burst into ~** söyüş yağdırmaq; **to fling/to hurl ~ at *smb.*** bir kəsin üstünə söyüş yağdırmaq

**inveigh** [ɪn'veɪ] *v* **(against)** qəzəblə/qeyzlə hücum etmək *(sözlə)*, söymək, abrını tökmək, söyüb biabır etmək; **to ~ against an official/against a law** rəsmi şəxsin/ qanunun əleyhinə qəzəblə çıxış etmək; **to ~ against *smb.*** bir kəsin abrını tökmək, bir kəsi söyüb biabır etmək

**inveigle** [ɪn'vi:gl] *v* tovlamaq, yoldan/başdan çıxartmaq, şirnikdirmək; həvəsləndirmək, tamahsınlandırmaq; *She inveigled her husband into buying a new car O, ərini tovlayıb təzə maşın aldırdı*

**invent** [ɪn'vent] *v* **1.** kəşf /ixtira etmək, **to ~ a machine/a radio** maşın/radio ixtira/ kəşf etmək; **to ~ a new method/a new fashion** yeni metod/moda yaratmaq; **2.** uydurmaq, özündən qondarmaq, quraşdırmaq; fikirləşib tapmaq; **to ~ an explanation** səbəb/bəhanə uydurmaq; **to ~ a story** əhvalat uydurmaq/qondarmaq; *All the characters in the book are invented Kitabdakı bütün obrazlar uydurmadır*

**invention** [ɪn'venʃn] *n* **1.** kəşf, ixtira; **the ~ of the**

**telescope/of radio/gunpowder** teleskopun/radionun/barıtın kəşfi; *The safety razor is a useful invention Təhlükəsiz ülgüc faydalı kəşfdir*; 2. uydurma, qondarma, quraşdırma, yalan, yalan-palan; *His story is a pure invention Onun danışdıqları tamam uydurmadır*; 3. ixtiraçılıq, ixtira/ixtiraçılıq qabiliyyəti; **a man of great ~** çox böyük ixtiraçılıq qabiliyyəti olan adam; **to possess the gift/the faculty of ~** ixtiraçılıq qabiliyyətinə malik olmaq; *Necessity is the mother of invention Ehtiyac ixtiranın anasıdır*

**inventive** [ɪn'ventɪv] *adj* ixtiraçı, fərasətli, bacarıqlı, zirək, hazırcavab, diribaş; **an ~ child** fərasətli /bacarıqlı /zirək uşaq

**inventively** [ɪn'ventɪvlɪ] *adv* yaradıcılıqla, yaradıcı surətdə; hazırcavablıqla, fərasətlə, ustalıqla, bacarıqla

**inventiveness** [ɪn'ventɪvnɪs] *n* ixtiraçılıq, ixtiraçılıq bacarığı/qabiliyyəti; zirəklik, diribaşlıq, hazırcavablıq, bacarıq, fərasət

**inventor** [ɪn'ventəʳ] *n* 1. ixtiraçı, ixtira/ kəşf edən; 2. uydurmaçı, qondarmaçı, yalançı, böhtançı; fantaziyaçı

**inventory**[1] ['ɪnvəntrɪ] *n* 1. inventarizasiya *(bir təsərrüfat və ya müəssisədə şeylərin siyahıya alınması)*; inventarizasiya siyahısı; **to take/to make up/to draw up an ~** inventarizasiya aparmaq, avadanlığın siyahısını tutmaq; **an ~ of household furniture** evdə olan mebelin siyahısı; 2. inventar hesab edilən/siyahısına daxil edilmiş mallar; **to have a sale to reduce the ~** artıq mallardan azad olmaq üçün satış təşkil etmək; 3. *amer.* yenidən uçota alma/hesablama, inventarı yenidən uçota alma/yoxlama; **the anuual ~ in January** yanvarda illik inventarizasiya

**inventory**[2] ['ɪnvəntrɪ] *v* 1. siyahıya almaq, inventar siyahısına salmaq; **to ~ the goods once a year** ildə bir dəfə malları yenidən uçota almaq/yoxlamaq; 2. cəmləmək, yekun vurmaq, yekunlaşdırmaq

**inverse**[1] ['ɪn'və:s] *n* əks sıra; əksi; *Analysis is the inverse of synthesis Analiz sintezin əksidir*

**inverse**[2] ['ɪn'və:s] *adj* əks, zidd; geri; *Division is the inverse operation of multiplication Bölmə əməliyyatı vurmanın əksidir*

**inversely** ['ɪn'və:slɪ] *adv* 1. geri, geriyə; əksinə, tərsinə, əks istiqamətdə; 2. inversiya yolu ilə

**inversion** [ɪn'və:ʃn] *n* 1. yerini dəyişmə/ dəyişdirmə; yerdəyişmə; sıranı/sırasını dəyişmə; birini digəri ilə əvəz etmə; **to perform a serious of ~s** bir sıra dəyişiklik etmək; 2. *qram.* inversiya *(cümlədə sözlərin yerdəyişməsi)*; 3. *anat.* adi vəziyyətdən yayınma

**invert** ['ɪnvə:t] *v* 1. çevirmək, döndərmək, baş-ayaq qoymaq; **to ~ a glass/a jar/a tumbler** stəkanı/parçı/qədəhi baş-ayaq çevirmək; **to ~ the soil** torpağı əkmək/ yumşaltmaq; 2. astar üzünə çevirmək; 3. sırasını dəyişmək; **to ~ the order of words in a sentence** cümlədə sözlərin sırasını dəyişmək; **to ~ the relation of cause and effect** səbəblə nəticə arasında olan əlaqəni əksinə çevirmək

**invertebrate** [ɪn'və:tɪbrət] *n* onurğasızlar; **worms and other small ~s** qurdlar və digər xırda onurğasızlar

**inverted** [ɪn'və:tɪd] *adj* 1. çevrilmiş, dönmüş, baş-ayaq qoyulmuş/çevrilmiş; **~ boat** çevrilmiş /dönmüş qayıq; **~ commas** dırnaq; 2. əks, inversiya edilmiş; **~ order of words** sözlərin inversiyası/yer dəyişməsi; 3. astar üzünə çevrilmiş

**invest** [ɪn'vest] *v* 1. pul/sərmayə/kapital qoymaq; **to ~ *one's* money in a business enterprise** pulunu ticarət müəssisəsinə qoymaq; **to ~ *one's* money in shares** pay almaq üçün sərmayə qoymaq; *The government has invested heavily in oil exploration Hökumət neft axtarışına çoxlu kapital/pul qoyub*; 2. geyindirmək, bəzəndirmək; **to ~ *smb.* with a gown** bir kəsə don geyindirmək; 3. *məc.* bürümək, çulğamaq, əhatə etmək; **to ~ *smb.* with glory** bir kəsi şöhrətləndirmək; *Darkness invests the earth at night Qaranlıq gecə yeri bürüyür/çulğayır*; 4. səlahiyyət/ rütbə /hakimiyyət vermək; *The governor has been invested with full authority to act Fəaliyyət göstərmək üçün qubernatora tam səlahiyyət verdilər*

**investigate** [ɪn'vestɪgeɪt] *v* 1. təhqiq etmək, araşdırmaq, yoxlamaq; diqqətlə nəzərdən keçirmək; **to ~ a crime** cinayəti araşdırmaq/təhqiq etmək; 2. öyrənmək; müəyyən etmək; **to ~ nature** təbiəti öyrənmək; *Scientists investigate nature Alimlər təbiəti öyrənirlər*

**investigation** [ɪn,vestɪ'geɪʃn] *n* 1. yoxlama, araşdırma, təhqiq etmə, istintaq; təhqiqat; **to carry on an ~** istintaq/araşdırma aparmaq; **the ~ of the truth** həqiqəti araşdırma; 2. tədqiqat *(elmi)*; **to carry on ~** tədqiqat işi aparmaq; *This problem requires a long investigation Bu problem uzunmüddətli araşdırma/tədqiqat tələb edir*

**investigative** [ɪn'vestɪgeɪtɪv] *adj* 1. hər şeyə maraq göstərən, hər şeyi bilmək istəyən; 2. təhqiqi; **~ journalism** təhqiqi jurnalistika

**investigator** [ɪn'vestɪgeɪtəʳ] *n* 1. tədqiqatçı; 2. sınaqçı, yoxlayıcı, sınayıcı

**investigatory** [ɪn'vestɪgeɪtərɪ] *adj* = **investigative**

**investiture** [ɪn'vestɪtʃəʳ] *n* 1. bir kəsin rəsmi olaraq vəzifəyə/hakimiyyətə gətirilməsi; **the ~ of the Prince of Wales** Uels şahzadəsinin rəsmi olaraq hakimiyyətə gətirilməsi; investitura *(orta əsrlərdə: vassalın və ya yepiskopun bir mülkə sahib olması və bu zaman keçirilən mərasim)*; 2. geyindirmə, geydirmə; paltar, geyim, libas

**investment** [ɪn'vestmənt] *n* 1. kapital/ sərmayə qoyuluşu; kapital /sərmayə qoyma *(bir işə və ya müəssisəyə)*; **a company's ~ plans** şirkətin kapital qoyma planları; 2. sərmayə/kapital qoyulan müəssisə və ya qiymətli kağız; investisiya; 3. geyim, paltar, libas



**investor** [ɪn'vestəʳ] *n* investor *(bir işə və ya müəssisəyə kapital/sərmayə qoyan adam)*, sərmayədar

**inveterate** [ɪn'vetərət] *adj* 1. islahedilməz, düzəldilməz, qatı; **~ gambler** qatı/islahedilməz qumarbaz; **~ liar** qatı/islahedilməz yalançı; 2. köksalmış, kökbağlamış, köhnə; **~ disease** köksalmış /köhnə xəstəlik; **~ hatred** köksalmış nifrət; **~ hostility** köhnə düşmənçilik

**invidious** [ɪn'vɪdɪəs] *adj* təhqiredici, ikrah doğuran; nifrətoyadan, kinoyadan; mənfur; **~ remark** təhqiredici irad

**invigilate** [ɪn'vɪdʒɪleɪt] *v* ciddi surətdə göz qoymaq/göz yetirmək/nəzarət etmək *(xüs imtahanda)*; **to ~ (at) the history exam** tarix imtahanına ciddi surətdə nəzarət etmək

**invigilation** [ɪn,vɪdʒɪ'leɪʃn] *n* nəzarət etmə *(imtahanda)*

**invigilator** [ɪn'vɪdʒɪleɪtəʳ] *n* nəzarətçi *(imtahana)*

**invigorate** [ɪn'vɪgəreɪt] *v* 1. güc/enerji/güc-qüvvət vermək, möhkəmlətmək; gücləndirmək; **to ~ *one's* body by exercise** məşq etməklə bədənini möhkəmlətmək; *The holiday at the sea invigorated us Dəniz kənarında istirahət bizə güc-qüvvət verdi*; 2. güclənmək, möhkəmlənmək; 3. ruhlandırmaq, ruh vermək; ilhamlandırmaq; *His speech invigorated the audience Onun nitqi dinləyiciləri ruhlandırdı*

**invigorating** [ɪn'vɪgəreɪtɪŋ] *adj* gücverən, möhkəmləndirən; **~ climate** gücverən/ möhkəmlədən iqlim/ab-hava

**invigoration** [ɪn,vɪgə'reɪʃn] *n* 1. güc vermə, möhkəmlətmə; 2. ruhlandırma, ruh vermə, canlandırma, ilhamlandırma, inam yaratma

**invincibility** [ɪn,vɪnsɪ'bɪlɪtɪ] *n* məğlubedilməzlik, yenilməzlik; güccatmazlıq; yola gəlməmə, ipəsapa yatmama; azğınlıq

**invincible** [ɪn'vɪnsəbl] *adj* məğlubedilməz, yenilməz, basılmaz, güccatmaz, qarşısıalınmaz, qüdrətli; **an ~ army** məğlubedilməz/yenilməz ordu; **~ power** güccatmaz/qarşısıalınmaz qüvvə; **~ obstacle** çətin/güccatmaz manеə; **~ will** yenilməz/ qüdrətli arzu; **an ~ team** yenilməz/məğlubedilməz komanda; **an ~ belief** yenilməz inam

**inviolability** [ɪn,vaɪələ'bɪlɪtɪ] *n* sarsılmazlıq, yenilməzlik, möhkəmlik, pozulmazlıq; toxunulmazlıq

**inviolable** [ɪn'vaɪələbl] *adj* sarsılmaz, yenilməz, möhkəm, pozulmaz, toxunulmaz; **~ rights** toxunulmaz hüquqlar; **~ laws** sarsılmaz/pozulmaz/möhkəm qanunlar; **~ borders/frontiers** toxunulmaz /pozulmaz sərhədlər; **~ oath** pozulmaz and; **~ treaty** pozulmaz/möhkəm saziş; **~ harmony** əbədi/sarsılmaz harmoniya

**inviolate** [ɪn'vaɪələt] *adj* pozulmayan, pozulmaz, sarsılmayan, sarsılmaz, dəyişməyən, dəyişməz; **to keep *one's* oath/vow ~** andına sadiq qalmaq, andını pozmamaq; **to keep a promise ~** vədinə əməl etmək/xilaf çıxmamaq; **to keep a rule ~** qanunu pozmamaq, qanuna dönmədən əməl etmək; *The treaty remained inviolate Müqavilə pozulmadı*

**invisible** [ɪn'vɪzəbl] *adj* 1. görünməyən, gözəgörünməz; ayırd edilə bilməyən, bir-birindən seçilməyən; **~ particles** gözəgörünməyən hissəciklər; **~ stars** görünməyən ulduzlar; **~ man** gözəgörünməyən adam; **to be ~ to the eye** gözlə görünməmək; *The sun is invisible because of the clouds Buludlara görə günəş görünmür*; 2. gizli, sirli, örtülü; xəlvəti; **~ earnings** gizli/xəlvəti qazanclar; **~ export/ import** xəlvəti ixrac/idxal

**invitation** [,ɪnvɪ'teɪʃn] *n* 1. dəvət; dəvət etmə /edilmə; dəvətnamə; **a letter of ~, a written ~** yazılı dəvət; **an ~ to dinner** nahara dəvət etmə; **to come by *smb.'s* ~** bir kəsin dəvətilə gəlmək; *Admission is by invitation only Giriş ancaq dəvətnamə ilədir*; **to send out ~s** dəvətnamə göndərmək; **to accept / to decline an ~** dəvəti qəbul/rədd etmək; *I accepted/ declined their invitation to join the tennis club Mən onların tennis klubuna üzv olmaq haqqındakı dəvətlərini qəbul etdim/rədd etdim*; 2. tovlama, aldadıb tora/tələyə salma

**invite**[1] ['ɪnvaɪt] *n* dəvət; *Did you get an invite Sən / Siz dəvət almısanmı? / almısınızmı?*

**invite**[2] [ɪn'vaɪt] *v* 1. dəvət etmək, çağırmaq; **to ~ *smb.* to dinner** bir kəsi nahara dəvət etmək; *He liked the girl and decided to invite her to dinner Onun qızdan xoşu gəldi və onu nahara dəvət etməyi qərara aldı*; **to ~ *smb.* to a wedding** bir kəsi toya çağırmaq/dəvət etmək; *He didn't invite me to his wedding O, məni toyuna çağırmadı/dəvət etmədi*; 2. meylləndirmək, təhrik etmək, cəzb etmək, rəğbət doğurmaq; *The quiet invites sleep Sakitlik yuxu gətirir*; **to ~ to speak frankly** bir kəsi açıq danışmağa təhrik etmək; 3. oyatmaq, doğurmaq, xahiş etmək; **to ~ question** sual doğurmaq; **to ~ *smb.* to reconsider his decision** bir kəsdən qərarına yenidən baxmağı xahiş etmək; *The letter invites some questions Məktub bir sıra sual doğurur*; 4. cəlb/cəzb etmək; başdan çıxartmaq, tovlamaq; **to ~ attention** diqqəti cəzb/cəlb etmək; *The swimming-pool invites us Üzgüçülük hovuzu bizi özünə cəzb edir*

**invitee** [,ɪnvaɪ'ti:] *n d.d.* dəvət olunan, çağırılan

**inviting** [ɪn'vaɪtɪŋ] *adj* 1. cəlbedici, cazibəli; cazibədar, şirnikdirici, yoldan/başdan çıxaran, tamahsılandırıcı; **~ look** cazibəli/cəlbedici baxış; **~ prospect** şirnikdirici / tamahsılandırıcı perspektiv /gələcək; **~ place** cəzbedici yer; **~ to the eye** gözoxşayan; *The sea looked really inviting Dəniz həqiqətən cazibədar görünürdü*; 2. dəvət edən, çağıran

**invitingly** [ɪn'vaɪtɪŋlɪ] *adv* 1. cəzbedici/ həvəsləndirici/tamahsılandırıcı bir tərzdə; 2. dəvət

edərək; *He drew the chair forward invitingly O oturmağa dəvət edərək stulu qabağa çəkdi*

**invocation** [ˌɪnvou'keɪʃn] *n* **1.** *şair.* muzaya müraciət; **2.** *din.* müraciət, xitab *(Allaha)*; **3.** *din.* ruhları çağırma; **4.** cadugərlik, sehrbazlıq, ovsunçuluq; **5.** *hüq.* çağırış *(məhkəməyə)*

**invoice**[1] ['ɪnvɔɪs] *n tic.* faktura *(buraxılan və ya yola salınan malların siyahısı)*; hesab; haqq-hesab; **to make out an ~** faktura yazmaq

**invoice**[2] ['ɪnvɔɪs] *adj* faktura; **~ amount** fakturanın ümumi məbləği; **~ cost** faktura qiyməti; **~ value** faktura dəyəri

**invoice**[3] ['ɪnvɔɪs] *v tic.* faktura/hesab yazmaq; *The company hasn't yet invoiced us for goods we bought Aldığımız mal üçün kompaniya hələ bizə faktura/hesab göndərməyib*

**invoke** [ɪn'vouk] *v* **1.** çağırmaq; yalvarmaq, müraciət etmək; istəmək; **to ~ *smb.*'s aid** bir kəsdən kömək istəmək; **to ~ protection** müdafiə etməyə çağırmaq; **to ~ vengeance** qisasa/qisas almağa çağırmaq; **2.** müraciət etmək, sitat gətirmək; **to ~ Plato** Platondan sitat gətirmək; **3.** ruhları çağırmaq; **to ~ evil spirits** şər qüvvələri *(cinləri, iblisi)* çağırmaq; **4.** *hüq.* çağırmaq *(məhkəməyə)*

**involuntarily** [ɪn'vɔləntərɪlɪ] *adv* təsadüfi olaraq, bilmədən, istəmədən, qeyri-iradi /qeyri-ixtiyari olaraq

**involuntariness** [ɪn'vɔləntərɪnɪs] *n* **1.** qəsdlə edilməmə, qəsdən/qərəzlə edilməmə; **2.** qeyri-iradəlilik, qeyri-ixtiyarilik

**involuntary** [ɪn'vɔləntrɪ] *adj* **1.** qəsdən olmayan/edilməyən, bilməyərək edilmiş; qəsdsiz, qərəzsiz; **~ obedience/submission** çarəsiz /məcburi itaət; **~ injury** təsadüfi zədə/yaralanma; **2.** qeyri-ixtiyari; **~ weeping** qeyri-ixtiyari ağlama; **~ movement** qeyri-ixtiyari hərəkət; **3.** həvəssiz, istəmədən

**involve** [ɪn'vɔlv] *v* **1.** olmaq, ...vardır; tərkibində/daxilində olmaq, ehtiva etmək; güman/fərz etmək, nəzərdə tutmaq, düşünmək, fikrində tutmaq; *Every argument involves some assumptions Hər bir mübahisədə nə isə bir niyyət/fikir olur*; **2.** səbəb olmaq, törətmək, nəticələnmək; *Holidays involve expense Bayramlar xərcə səbəb olur; It involves trouble Bu xoşagəlməz hadisəyə səbəb olur*; **3.** cəlb etmək, qatmaq, sövq etmək; **to ~ a nation in war** ölkəni müharibəyə sövq etmək; **to ~ *smb.* in debt** bir kəsi borca salmaq; **to be deeply ~d in debt** çox borclu olmaq; **to ~ *smb.* in a good deal of trouble** bir kəsi çox pis vəziyyətə salmaq; **to ~ *smb.* in a crime** bir kəsi cinayətə sövq etmək/qatmaq; **4.** çətinləşdirmək, çətinə salmaq; **to ~ a question in difficulty** məsələni çətinə salmaq; **5.** dalmaq, məşğul olmaq; *She was involved in work O, işlə məşğul idi*; **6.** bürümək, örtmək; *Clouds involved the mountain-top Buludlar dağın başını/ təpəsini bürümüşdü*; **7.** quyrulmaq, qıvrılmaq; *The serpent involved its folds in a coil İlan qıvrıldı*; **8.** *riyaz.* qüvvətə yüksəltmək

**involved** [ɪn'vɔlvd] *adj* çətin, dolaşıq, qarışıq; mürəkkəb; **~ mechanism** mürəkkəb mexanizm; **an ~ sentence** mürəkkəb cümlə; **an ~ explanation** dolaşıq izahat; **to be/to become/to get ~ in criminal actrivities** cinayət əməllərində əli olmaq; **to be/to become/to get ~ in politics** siyasətə qarışmaq; *He knew about the robbery, but wasn't directly/personally involved Onun qarətdən xəbəri var idi, lakin cinayətdə bilavasitə/şəxsən iştirak etməmişdi*

**involvement** [ɪn'vɔlvmənt] *n* **1.** dolaşıqlıq, qarışıqlıq, çətinlik; mürəkkəblik; **2.** *tib.* zədələmə, zədələnmə, pozma, pozulma; **neurotic ~** əsəb pozğunluğu

**invulnerability** [ɪnˌvʌlnərə'bɪlɪtɪ] *n* toxunulmazlıq, alınmazlıq

**invulnerable** [ɪn'vʌlnərəbl] *adj* alınmaz, toxunulmaz; **a fortification that is ~** alınmaz istehkam; məğlubedilməz; **~ football team** məğlubedilməz futbol komandası

**inward**[1] ['ɪnwəd] *adj* **1.** daxili; **the ~ parts of the body** bədənin daxili orqanları; içalat; **~ nature** daxili aləm/mahiyyət; **~ joy/doubts** daxili sevinc/şübhələr; **2.** içəri; **~ Africa** içəri Afrika; **3.** daxilə/içə yönəlmiş; **~ direction/curve** daxilə yönəlmiş istiqamət/əyri; **4.** yaxın dost, ürək dostu; *I was an inward of his Mən onun yaxın/ürək dostlarından biri idim*;

◊ **the ~ man** insanın daxili aləmi

**inward**[2] ['ɪnwəd] *adv* içəri, içəriyə, daxilə; **to bend a thing ~** bir şeyi içəri/içəriyə əymək; **to lead ~** içəriyə/içəri aparmaq

**inwardly** ['ɪnwədlɪ] *adv* **1.** içəridə, daxildə; **to bleed ~** daxildə qanaxma hiss etmək; **2.** içəri, daxilə; **to curve ~** içəri/daxilə əymək; **3.** daxilən, öz-özünə; gizlin; **to curse *smb.* ~** bir kəsə gizli lənət yağdırmaq; **to be ~ grateful** daxilən minnətdar olmaq; **to groan/to smile ~** öz-özünə inildəmək/gülümsəmək

**inwardness** ['ɪnwədnɪs] *n* əsl təbiət, mahiyyət; **to explain the ~ of poetry** poeziyanın mahiyyətini izah etmək; **the true ~** əsl mahiyyət; **the ~ of his writings** onun yazılarının mahiyyəti

**iodine**[1] ['aɪədi:n] *n kim.* yod

**iodine**[2] ['aɪədi:n] *adj* yod; **~ compound** yod birləşmələri; **~ poisoning** *tib.* yod zəhərlənməsi, yoddan zəhərlənmə

**ion** ['aɪən] *n fiz.* ion *(elektrik yükü olan atom)*

**-ion** [-ən] *(həm də* **-ation, -ition, -sion, -xion)** *suff. Bir sıra isimlərin düzəldilməsində iştirak edir və bu qəbildən olan isimlər aşağıdakı mənalara malik olur: 1) hərəkət və ya proses bildirir:* conversation söhbət; separation ayırma; competition yarış; preparation hazırlıq; *2) vəziyyət və ya keyfiyyət bildirir:* satisfaction məmnuniyyət; hesitation tərəddüd; conviction inam; *3) hərəkətin nəticəsini bildirir:* classification təsnifat; translation tərcümə; notion anlayış

**ionosphere** [aɪ'ɔnəsfɪə] *n* ionosfer *(atmosferin 100-140 km hündürlükdə olan yuxarı təbəqələri)*

**iota** [aɪ'outə] *n* **1.** yota *(yunan əlifbasının 9-cu hərfi)*; **2.** ən cüzi/kiçik məbləğ, zərrə; *There is not an /one iota of truth in this story Bu hekayədə bir zərrə qədər həqiqət yoxdur*

**irascibility** [ɪˌræsɪ'bɪlɪtɪ] *n* tez acıqlanma/ hirslənmə; tündməcazlıq, əsəbilik; çılğınlıq

**irascible** [ɪ'ræsɪbl] *adj* tezacıqlanan, tezhirslənən, tündməcaz, əsəbi, hirsli, tez özündən çıxan; **an ~ man** tündməcaz/əsəbi /hirsli adam

**irate** [aɪ'reɪt] *adj* acıqlı, hirsli, qeyzli, tündxasiyyət; qəzəbli, hiddətli; **~ customers demanding their money back** pulunun geri qaytarılmasını tələb edən hirsli müştərilər

**ire** ['aɪə] *n şair.* qəzəb, qeyz, hirs, acıq; kin; **to arouse/to provoke *smb.*'s ~** bir kəsi qəzəbləndirmək / hirsləndirmək / acıqlandırmaq

**iridescence** [ˌɪrɪ'desns] *n* əlvanlıq, rəngarənglik; rəngdən-rəngə çalma, bərq vurma

**iridescent** [ˌɪrɪdesnt] *adj* əlvan, rəngbərəng; rəngdən-rəngə çalan, bərq vuran; **~ feathers** rəngdən-rəngə çalan/bərq vuran /əlvan lələklər

**iridium** [ɪ'rɪdɪəm] *n kim.* iridium *(aztapılan kimyəvi element)*

**iris** [aɪrɪs] *n* **1.** *anat.* qüzehi qişa *(gözün əlvan təbəqəsi)*; **2.** *bot.* süsən *(çiçək)*; **3.** *astr.* göy qurşağı, qövsi-qüzeh

**Irish**[1] ['aɪrɪʃ] *n* **1.: the ~** *top.i* irlandiyalılar, İrlandiya xalqı; **2.** irland dili

**Irish**[2] ['aɪrɪʃ] *adj* İrlandiya; **the ~ Republic** İrlandiya Respublikası; **~ stew** soğan və digər tərəvəzlərdən hazırlanmış xörək

**Irishman** ['aɪrɪʃmən] *n (pl* **-men** [-men]) irlandiyalı *(kişi)*

**Irishwoman** ['aɪrɪʃˌwumən] *n (pl* **-women** [-ˌwɪmɪn]) irlandiyalı qadın/qız

**irk** [ə:k] *v arx* acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək; təngə gətirmək, bezdirmək, usandırmaq, cana gətirmək; *It irks me to wait so long Belə uzun-uzadı gözləmək məni əsəbiləşdirir/cana gətirir/ usandırır*

**irksome** ['ə:ksəm] *adj* yorucu, üzücü, hirsləndirici, əsəbiləşdirici; bezar edən, usandırıcı, zəhlətökən, cana gətirən; **~ task** yorucu/ üzücü /bezdirici tapşırıq

**irksomely** ['ə:ksəmlɪ] *adv* yorucu/darıxdırıcı /usandırıcı bir tərzdə, təngə gətirərək, bezdirərək

**irksomeness** ['ə:ksəmnɪs] *n* yoruculuq, üzücülük, darıxdırıcılıq, usandırıcılıq

**iron**[1] ['aɪən] *n* **1.** *kim.* dəmir; qara metal; **cast ~** çuqun; **made of ~** dəmirdən hazırlanmış/qayrılmış; **a man of ~** dəmir kimi/dəmir iradəli adam; **muscles of ~** dəmir kimi əzələlər; **will of ~** dəmir iradə; **2.** ütü; **pressing/electric ~** dərzi/ elektrik ütüsü; **3.** *pl* qandal; buxov, zəncir; əl qandalı; **to put in ~s** qandallamaq, buxovlamaq, qandal/buxov vurmaq;

◊ *Strike while the iron is hot at.söz. Dəmiri isti-isti döyərlər*; **to have (several) ~s in the fire** ≅ bir əldə iki qarpız tutmaq

**iron**[2] ['aɪən] *adj* **1.** dəmir, dəmirdən qayrılmış/düzəldilmiş; **~ gate/door** dəmir darvaza/qapı; **2.** möhkəm, əyilməz, sarsılmaz; dəmir; **~ will** dəmir/möhkəm iradə; **to have an ~ will** dəmir/möhkəm iradəyə malik olmaq; **an ~ resolution** sarsılmaz/möhkəm qətiyyət; **to display an ~ resolution** möhkəm/sarsılmaz qətiyyət göstərmək; **3.** çətin, amansız, ağır, qəddar; **the ~ years of war** müharibənin ağır /çətin illəri;

◊ **Iron Curtain** dəmir pərdə; **~ horse** dəmir at *(traktor, parovoz və s.)*

**iron**[3] ['aɪən] *v* **1.** ütüləmək; **to ~ a shirt** köynək ütüləmək; *I've my shirt ironed Mən köynəyimi ütülətmişəm/ütülətdirmişəm*; **2. (out)** qaydaya salmaq, yoluna qoymaq, həll etmək *(xüs. müzakirələr/ danışıqlar vasitəsilə)*; **to ~ out problems** problemləri həll etmək; **3.** qandallamaq, buxovlamaq, qandal/buxov vurmaq; *The prisoners were ironed Dustaqları qandallamışdılar*

**iron age** ['aɪəneɪdʒ] *n* dəmir dövrü

**iron-foundry** ['aɪənˌfaundrɪ] *n* çuquntökmə zavodu

**iron-grey**[1] ['aɪən'greɪ] *n* **1.** boz dəmir rəng; **2.** boz at/it

**iron-grey**[2] ['aɪən'greɪ] *adj* gümüşü, polad rəngli; **~ hair** gümüşü saç

**iron-handed** ['aɪən'hændɪd] *adj* **1.** qəddar, amansız, istibdad, zalım, müstəbid; **2.** sarsılmaz, möhkəm, mətin, səbatlı

**iron-hearted** ['aɪən'ha:tɪd] *adj* daşürəkli, rəhmsiz, insafsız; amansız, qəddar, zalım

**ironic** [aɪ'rɔnɪk] *adj* = **ironical**

**ironical** [aɪ'rɔnɪkl] *adj* istehzalı; **~ smile** istehzalı təbəssüm; **~ laugh** istehzalı gülüş

**ironically** [aɪ'rɔnɪklɪ] *adv* istehza ilə, rişxəndlə; *She smiled ironically O rişxəndlə /istehza ilə gülümsədi*

**iron-mine** ['aɪənmaɪn] *n* dəmir filizi çıxaran/emal edən şaxta

**ironworks** ['aɪənwə:ks] *n* çuquntökmə zavodu

**irony**[1] ['aɪrənɪ] *n* istehza, rişxənd; **the ~ of fate** taleyin istehzası; qəribə təsadüf

**irony**[2] ['aɪrənɪ] *adj* dəmir; dəmirli; **~ chains** dəmir zəncir; **~ particles** dəmirli hissəciklər

**irradiance** [ɪ'reɪdjəns] *n* şəfəq, işıq, parıltı, şölə; **phosphoric ~** fosfor parıltısı

**irradiant** [ɪ'reɪdjənt] *adj* şəfəqsaçan, işıqsaçan, parlaq; **the ~ sun** parlaq günəş

**irradiate** [ɪ'reɪdɪeɪt] *v* **1.** işıqlandırmaq, nurlandırmaq, şəfəqləndirmək, işıq/şəfəq saçmaq; *Lightning irradiated the ground Şimşək yeri işıqlandırdı; Joy irradiated her face Sevinc*

*onun üzünü nurlandırdı*; 2. izah etmək, aydınlaşdırmaq, aydınlıq gətirmək *(bir məsələyə)*; 3. genişləndirmək, yaymaq *(biliyi)*; 4. radiasiyaya məruz qalmaq; radiasiya ilə müalicə etmək; 5. *fiz.* şüa buraxmaq

**irradiation** [ɪ,reɪdɪ'eɪʃn] *n* 1. işıqlandırma, işıq salma, işıqlanma, şəfəqləndirmə, şəfəqlənmə, şəfəq salma; 2. parlaqlıq, parlama; 3. *fiz.* irradiasiya; **atomic** ~ radioaktiv şüalanma

**irradiative** [ɪ'reɪdɪeɪtɪv] *adj* parlaq, parıldayan, parlayan; nurlu, nursaçan, şəfəqsaçan

**irrational** [ɪ'ræʃənl] *adj* 1. ağılsız, düşüncəsiz; səmərəsiz; ~ **behaviour** ağılsız/ düşüncəsiz davranış; ~ **conduct** düşüncəsiz /ağılsız hərəkət; 2. *riyaz.* irrasional; ~ **number** irrasional ədəd

**irrationality** [ɪ,ræʃə'nælɪtɪ] *n* 1. ağılsızlıq, düşüncəsizlik; məntiqsizlik, mənasızlıq; 2. *riyaz.* irrasionallıq

**irrationally** [ɪ'ræʃnəlɪ] *adv* ağılsızcasına, düşüncəsizcəsinə, məntiqsizcəsinə; gic-gic, axmaq-axmaq, axmaqcasına; **to act** ~ düşüncəsiz/gic-gic hərəkət etmək

**irrealizable** [ɪ'rɪəlaɪzəbl] *adj* həyatakeçirilməz, həyata keçirilməsi mümkün olmayan, həyata keçirilə bilməyən, yerinə yetirilə bilməyən

**irreceivability** ['ɪrɪ,si:və'bɪlɪtɪ] *n* qəbuledilməzlik, qəbul edilə bilməmə *(təklif, qərar və s. haq.)*

**irreciprocal** [,ɪrɪ'sɪprəkl] *adj* birtərəfli

**irrecognizable** [ɪ'rekəgnaɪzəbl] *adj* tanınmaz, tanınması mümkün olmayan

**irreconcilability** [ɪ,rekənsaɪlə'bɪlɪtɪ] *n* 1. barışmazlıq, uzlaşmazlıq; razı olmama, razılaşmama; 2. bir araya sığmazlıq, bir araya sığışa bilməmə, ziddiyyət

**irreconcilable** [ɪ'rekənsaɪləbl] *adj* 1. barışmaz, uzlaşmaz; ~ **enemies** barışmaz düşmənlər; ~ **views/differences/facts** barışmaz fikirlər/fərqlər/faktlar; 2. ziddiyyətli, bir araya sığmayan; ~ **statements** ziddiyyətli bəyanatlar

**irreconcilably** [ɪ'rekənsaɪləblɪ] *adv* 1. barışmaz/uzlaşmaz bir tərzdə; 2. ziddiyyətli /uyuşmaz bir surətdə

**irrecoverable** [,ɪrɪ'kʌvrəbl] *adj* düzəlməz, düzəldilə bilməyən, düzəldilməsi mümkün olmayan; qayıtmaz, qaytarılmaz, qaytarıla bilməyən; ~ **state of happiness** qaytarılması mümkün olmayan xoşbəxtlik; ~ **ruin** qaytarılması mümkün olmayan ziyan/zərər/itki; *Wasted time is irrecoverable İtirilmiş vaxt geri qayıtmaz*

**irredeemable** [,ɪrɪ'di:məbl] *adj* 1. alınmayan, alına bilməyən; ödənilməyən, ödənilə bilməyən; ~ **debt** ödənilə bilməyən borc; 2. düzəldilə bilməyən, düzəlməz; ~ **mistakes** düzəldilə bilməyən səhvlər; **man's** ~ **nature** insanın islah edilməz təbiəti/xasiyyəti; ~ **scoundrel** islaholunmaz yaramaz/alçaq *(adam)*; 3. xırdalanmayan, xırdalana bilməyən *(kağız pul haq.)*; ~ **bank-note** xırdalanmayan kağız pul

**irreducibility** ['ɪrɪ,dju:sə'bɪlɪtɪ] *n* sadələşdirilməsi/yaxşılaşdırılması mümkün olmama

**irreducible** [,ɪrɪ'dju:səbl] *adj* 1. sadələşdirilə/yaxşılaşdırıla bilməyən; 2. son, ən son, son həddə çatdırılmış, minimal, ən az/kiçik; 3. *tib.* əlacsız, sağaldıla bilməyən

**irrefutable** [ɪ'refjutəbl] *adj* təkzibedilməz, təkzib edilə bilməyən; rəddedilməz; ~ **argument** təkzibedilməz dəlil/sübut

**irregular**[1] [ɪ'regjulə[r]] *n* 1. qeyri-müntəzəm ordunun əsgəri; 2. *pl* qeyri-müntəzəm ordu; 3. müvəqqəti vəzifə tutan adam

**irregular**[2] [ɪ'regjulə[r]] *adj* 1. qaydasız, qaydaya tabe olmayan; qeyri-adi; ~ **proceeding** qeyri-adi hərəkət; ~ **behaviour** qeyri-adi davranış; ~ **process** qeyri-adi proses; ~ **appetite** görünməmiş/həddən artıq iti iştaha; 2. qeyri-qanuni, qanunsuz; ~ **marriage** qeyri-qanuni/qanunsuz kəbin; ~ **child** qeyri-qanuni/kəbinsiz olaraq doğulmuş uşaq, bic; 3. qeyri-müntəzəm, qeyri-bərabər, qeyri-standart, standart olmayan; dəyişkən; ~ **velocity** qeyri-bərabər sürət; ~ **breathing** qırıq-qırıq nəfəsalma; 4. nizamsız, qarmaqarışıq, səliqəsiz, dağınıq; 5. əxlaqsız, ədəbsiz, pozğun; ~ **conduct** pozğun/ əxlaqsız davranış; 6. *hərb.* qeyri-nizami; ~ **troops** qeyri-nizami ordular; 7. *qram.* qaydasız, qaydaya tabe olmayan; ~ **verbs** qaydasız fellər

**irregularity** [ɪ,regju'lærɪtɪ] *n* 1. yanlışlıq, düzgün/doğru olmama; səhv; qaydadan kənara çıxma; 2. simmetriyasızlıq, qeyri-mütənasiblik; qeyri-standart; 3. əyri-üyrülük, kələ-kötürlük; **the** ~ **of the earth's surface** yer səthinin kələ-kötürlüyü; 4. əxlaqsızlıq, pozğunluq

**irregularly** [ɪ'regjuləlɪ] *adv* yanlışcasına, düzgün olmayaraq; qeyri-müntəzəm surətdə

**irrelevance** [ɪ'reləvəns] *n* 1. yersizlik, münasibətsizlik; həqiqətə uyğun olmama, ağlabatmama; tənasübsüzlük, uyğunsuzluq; əndazəsizlik; 2. yersiz sual/irad

**irrelevant** [ɪ'reləvənt] *adj* yersiz, münasibətsiz, dəxli olmayan; qəbuledilməz; ~ **remarks** yersiz iradlar; ~ **testimony** işə dəxli olmayan şahidlik; *What you say is irrelevant to the matter Sənin/Sizin dediyinin/dediyinizin məsələyə dəxli yoxdur*

**irreligious** [,ɪrɪ'lɪdʒəs] *adj* ateist, dinə/ allaha inanmayan; **his** ~ **talk** onun ateist /din əleyhinə söhbəti; **an** ~ **person** dinə/ allaha inanmayan/ateist adam

**irremediable** [,ɪrɪ'mi:dəbl] *adj* 1. düzəldilməz, düzəldilə bilməyən; ~ **mistake** düzəldilməsi mümkün olmayan səhv; 2. sağalmaz, əlacsız, çarəsiz, müalicəsi olmayan, müalicəolunmaz; ~ **disease** müalicəsi mümkün olmayan/müalicəolunmaz xəstəlik

**irremissible** [,ɪrɪ'mɪsbl] *adj* 1. bağışlanılmaz; ~ **sin** bağışlanılmaz günah; 2. məcburi, vacib; zəruri; ~ **duties** vacib/zəruri vəzifələr



**irreparable** [ɪ'repərəbl] *adj* 1. düzəlməz, düzəldilməsi mümkün olmayan, çarəsiz; ~ **damage/injury** düzəldilməsi mümkün olmayan ziyan; 2. əvəzolunmaz, qayıtmaz, qaytarılmaz; ~ **loss** qaytarılmaz itki; *His death is an irreparable loss to the nation Onun ölümü millət üçün əvəzolunmaz itkidir*

**irreplaceable** [,ɪrɪ'pleɪsəbl] *adj* əvəzolunmaz; **an** ~ **antique vase** əvəzolunmaz qədim/antiq vaza

**irrepressible** [,ɪrɪ'presəbl] *adj* tabe/ram olmayan, yola gəlməyən, azğın, ipə-sapa yatmayan;

**irreproachability** ['ɪrɪ,proutʃə'bɪlɪtɪ] *n* eyibsizlik, nöqsansızlıq, qüsursuzluq, mükəmməllik

**irreproachable** [,ɪrɪ'proutʃəbl] *adj* eyibsiz, qüsursuz, mükəmməl; gözəl, əla; ~ **behaviour** qüsursuz davranış; **an** ~ **piece of architecture** mükəmməl/əla memarlıq əsəri; ~ **conduct** eyibsiz/qüsursuz əxlaq

**irreproachably** [,ɪrɪ'proutʃəblɪ] *adv* nöqsansız, eyibsiz, qüsursuz olaraq, yaxşı, gözəl, əla; **to work** ~ qüsursuz işləmək

**irresistibility** [ɪrɪ,zɪstə'bɪlɪtɪ] *n* 1. rəfedilməzlik, güc çatmazlıq, kənar edilə bilməzlik; 2. dəfedilməzlik, qarşısı alınmazlıq; 3. təkzib edilməzlik, qətilik

**irresistable** [,ɪrɪ'zɪstəbl] *adj* 1. rəfedilməz, güc çatmayan, aradan qaldırıla bilməyən; qarşısıalınmaz; ~ **desire** rəfedilməz arzu; ~ **torrent** qarşısıalınmaz axın; 2. inkaredilməz; inkaredilməz sübut/dəlil

**irresolute** [ɪ'rezəlu:t] *adj* qətiyyətsiz, qərarsız, mütərəddid; şübhələnən, şübhə/ tərəddüd edən; ~ **person** qətiyyətsiz adam; *He is irresolute whose part to take O, kimin tərəfini saxlamaqda tərəddüd edir/qətiyyətsizlik göstərir*

**irresolution** ['ɪ,rezə'lu:ʃn] *n* qətiyyətsizlik, qərarsızlıq, mütərəddidlik, tərəddüd, şübhə

**irresolutely** [ɪ'rezəlu:tlɪ] *adv* tərəddüdlə, qəti olmayaraq, mütərəddid bir surətdə, qərarsız bir tərzdə

**irresolvable** [,ɪrɪ'zɔlvəbl] *adj* həlledilməz, həll edilə bilməyən; **an** ~ **problem** həlledilməz problem

**irrespective of** [,ɪrɪs'pektɪv əv] *prep* asılı olmayaraq; ~ **age** yaşdan asılı olmayaraq; ~ **what has been said** deyiləndən asılı olmayaraq; ~ **consequences** nəticədən asılı olmayaraq; ~ **differences** fərqlərə baxmayaraq, fərqlərdən asılı olmayaraq

**irrespectively** [,ɪrɪs'pektɪvlɪ] *adj* baxmayaraq, asılı olmayaraq, nəzərə almadan, şərtsiz, mütləq; ayrıca olaraq; **to consider** ***smth.*** ~ bir şeyi ayrıca olaraq nəzərdən keçirmək

**irresponsibility** [,ɪrɪspɔnsɪ'bɪlɪtɪ] *n* məsuliyyətsizlik

**irresponsible** [,ɪrɪs'pɔnsəbl] *adj* 1. cavabdeh/məsul olmayan, cavabdehlik/məsuliyyət daşımayan; 2. məsuliyyətsiz; qeyri-ciddi; ~ **behaviour /action** məsuliyyətsiz davranış/hərəkət; 3. ağlı başında olmayan, ağlı başından çıxmış; ~ **imbecile** ağlını itirmiş

**irresponsibly** [,ɪrɪs'pɔnsɪblɪ] *adv* məsuliyyətsiz, məsuliyyətsizcəsinə, məsuliyyətsiz bir tərzdə/surətdə; qeyri-ciddi, düşüncəsiz

**irretrievable** [,ɪrɪ'tri:vəbl] *adj* 1. qayıtmaz, dönməz, yeri doldurulmaz; həmişəlik, əbədi; ~ **loss** əbədi itki; 2. düzəldilməz, düzəldilməsi mümkün olmayan; ~ **mistake** düzəldilməz /düzəldilməsi mümkün olmayan səhv

**irretrievably** [,ɪrɪ'tri:vəblɪ] *adv* 1. qayıtmaz, dönməz, qaytarılmaz; 2. həmişəlik, biryolluq, əbədi olaraq; 3. ümidsiz halda, ümidsizcəsinə

**irreverence** [ɪ'revərəns] *n* hörmətsizlik, saygısızlıq, ehtiramsızlıq, saymazlıq

**irreverend** [ɪ'revərənd] *adv* hörmətə layiq olmayan; ~ **behaviour** hörmətə layiq olmayan davranış

**irreverent** [ɪ'revərənt] *adj* hörmətsiz, saygısız, hörmət etməyən/göstərməyən/gözləməyən, adamsaymayan

**irreverently** [ɪ'revərəntlɪ] *adv* hörmətsizliklə, saymazyana, ehtiramsızlıqla

**irreversible** [,ɪrɪ'və:səbl] *adj* 1. ləğv edilə bilməyən; bərpa olunmaz, geriqayıtmaz; ~ **decree** ləğv oluna bilməyən dekret/qanun; 2. geri hərəkət edə bilməyən; dönməz; ~ **process** dönməz proses; 3. birüzlü *(parça haq.)*

**irrevocable** [ɪ'revəkbl] *adj* qəti, qayıtmaz, dönməz; ~ **decision** qəti qərar; **the** ~ **yesterday** keçmişin qayıtmazlığı/geri dönməzliyi

**irrevocably** [ɪ'revəkblɪ] *adv* qayıtmaz, dönməz, qaytarılmaz; əbədi olaraq; daim, həmişə

**irrigable** [ɪ'rɪgəbl] *adj* suvarılan, suvarıla bilən

**irrigate** ['ɪrɪgeɪt] *v* 1. suvarmaq; 2. *tib.* yumaq *(yaranı və s.)*

**irrigation**[1] [,ɪrɪ'geɪʃn] *n* 1. suvarma, suvarılma; süni suvarma; *Irrigation has greatly increased the area of cultivated land Süni suvarma becərilən torpaqların sahəsini xeyli genişləndirib*; 2. *tib.* yuma *(yaranı və s.)*

**irrigation**[2] [,ɪrɪ'geɪʃn] *adj* suvarma; ~ **canal** suvarma kanalı; ~ **plant** süni suvarma qurğusu; ~ **station** süni suvarma stansiyası; ~ **water** süni suvarma üçün su

**irrigator** ['ɪrɪgeɪtə[r]] *n* 1. irriqator *(suvarma mütəxəssisi)*; 2. suvarma kanalı/qurğusu

**irritability** [,ɪrɪtə'bɪlɪtɪ] *n* 1. tez qıcıqlanma/hirslənmə, tündməcazlıq, əsəbilik; 2. *fiziol.* qıcıqlanma qabiliyyəti, həyacanlanma, təsirlənmə

**irritable** ['ɪrɪtəbl] *adj* 1. tezqıcıqlanan, tezhirslənən, tündməcaz, əsəbi; ~ **temper** tündməcaz xarakter; ~ **disposition** əsəbi vəziyyət/hal; **to become** ~ əsəbi/ tündməcaz olmaq; **to make** ~ əsəbiləşdirmək; *The delay made everybody irritable Gecikmə/Yubanma hamını əsəbiləşdirdi*; 2. iltihabdan qızarmış/ şişmiş

**irritably** ['ırıtəblı] *adv* əsəbi halda/tərzdə, əsəbiliklə, əsəbi-əsəbi; *"Can't you be quiet!" his mother said irritably "Sakit dura bilmirsən!" onun anası əsəbi halda dedi*

**irritant¹** ['ırıtənt] *n* qıcıqlandırıcı, qıcıqlandırıcı amil; *The noise of traffic is a constant irritant Küçə hərəkətinin səsi daima qıcıqlandırıcıdır*

**irritant²** ['ırıtənt] *adj* qıcıqlandırıcı, qıcıq oyadan

**irritate** ['ırıteıt] *v* **1.** əsəbiləşdirmək, acıqlandırmaq, hirsləndirmək, cinləndirmək, qızışdırmaq; **to be ~ed by/at the delay** yubatmaya /gecikdirməyə görə hirslənmək; **2.** qıcıqlandırmaq; *The smoke irritates my eyes Tüstü gözlərimi qıcıqlandırır/ayışdırır*

**irritation** [ˌırı'teıʃn] *n* acıqlanma, əsəbiləşmə; qıcıqlanma; acıq, hirs; **with ~** əsəbi halda, acıqlı-acıqlı, hirsli-hirsli; *John noted with some irritation that the gate had been left open Con bir az əsəbi halda qeyd etdi ki, darvaza açıq qalıb*

**irritative** ['ırıteıtıv] *adj* qıcıqlandırıcı; **~ agent** qıcıqlandırıcı faktor

**-ise** [aız] *suff.* = **-ize**

**-ish** [-ıʃ] *suff. Nisbi sifətlər düzəltmək üçün işlədilir:* Turk**ish** türk; Brit**ish** Britaniya; Pol**ish** Polşa; redd**ish** qırmızı**mtraq**; yellow**ish** sarı**mtıl**; blue**ish** göy**ümtül**; cold**ish** soyuq**təhər**; tall**ish** hündür**təhər**

**-ishly** [-ıʃlı] *suff Zərf düzəltmək üçün işlədilir:* fool**ishly** axmaqcasına; child**ishly** uşaqcasına; self**ishly** eqoistcəsinə

**Islam** ['ızla:m, ıs'la:m] *n* Islam, müsəlmanlıq

**Islamic** [ız'læmık] *adj* islam, müsəlman; **~ countries** müsəlman ölkələri; **~ laws** islam / müsəlman qanunları

**Islamizm** ['ızləmızm] *n* islamiyyət, müsəlmanlıq, islam dili

**Islamize** ['ızləmaız] *v* müsəlmanlaşdırmaq, müsəlman etmək; müsəlmanlığı qəbul etmək

**island** ['aılənd] *n (qısa forması:* **I, Is)**

**islander** ['aıləndə'] *n* adalı, ada sakini, adada yaşayanlar

**isle** [aıl] *n şair.* ada

**islet** ['aıslıt] *n* adacıq, kiçik/balaca ada

**-ism** [-ızm] *suff. Mücərrəd isim düzəltmək üçün işlədilir:* class**ism** klass**izm**; real**ism** real**izm**; romantic**ism** romant**izm**; feodal**ism** feodal**izm**; capital**ism** kapital**izm**; social**ism** sosial**izm**; archa**ism** arxa**izm**

**isn't** ['ıznt] **is not** *birləşməsinin qısa forması*

**isolate** ['aısəleıt] *v (xüs. məchulda işlənir)* təcrid etmək, ayırmaq, kəsmək *(əlaqəni)*; **to ~ from the whole world** bütün dünyadan təcrid etmək/ayırmaq; **to ~ a patient** xəstəni ayırmaq /təcrid etmək; *Britain has isolated itself from other members of the Community Britaniya özünü Avropa Birliyinin digər üzvlərindən təcrid edib; Several villages have been isolated from other parts of the country by heavy snowfalls Güclü qar bir neçə kəndi ölkənin başqa bölgələrindən təcrid edib/ ayırıb*

**isolated** ['aısəleıtıd] *adj* **1.** təcrid edilmiş/ olunmuş; ayrılmış; təsadüfən baş verən; **an ~ case** təsadüfi hal; **2.** tək, təkcə, tənha; **an ~ building** tək bina; **to feel lonely and ~** özünü tənha və təcrid edilmiş hiss etmək

**isolation** [aısə'leıʃn] *n* təcrid, təcrid olunma, ayrılıq, təklik, tənhalıq, yalqızlıq; **to live in ~** tənhalıqda yaşamaq

**isolationism** [ˌaısə'leıʃənızm] *n* izolyasionizm *(ABŞ mürtəce dairələrinin Avropa işlərinə "qarışmamaq" şüarı altında illər boyu yeritdiyi qatı imperializm siyasəti)*

**isolationist** [ˌaısə'leıʃnıst] *n* izolyasionist, izolyasionizm tərəfdarı

**isotope** ['aısətoup] *n kim.* izotop *(eyni kimyəvi elementin atomlarının müxtəlif növü)*; **radioactive ~s** radioaktiv izotoplar; **heavy ~s** ağır izotoplar

**issue¹** ['ısju:, 'ıʃju:] *n* **1.** buraxma, buraxılış; **an over ~** həddən artıq/hədsiz buraxılış; **an under ~** yetərsiz buraxılış; **the ~ of stamps** marka buraxma/buraxılışı; **the ~ of coinage** sikkə buraxma; **2.** nəşr, nəşr/ çap etmə; say, nüsxə *(qəzet, jurnal və s. haq.)*; **today's ~** bugünkü sayı *(qəzetin və s.)*; **3.** vermə; verilmə; **the ~ of overcoats to soldiers** əsgərlərə şinel vermə; **a daily ~ of free milk to schoolchildren** məktəb uşaqlarına gündəlik pulsuz süd vermə; **4.** axma, axıb gəlmə, tökülmə; **the ~ of water from a pipe** borudan suyun axması; **an ~ of blood from the nose /from a wound** burundan/yaradan qan axma; **5.** yol, çıxış; deşik, dəlik; **an ~ for water/ smoke** su/tüstü çıxmaq üçün yol/ deşik; **without any ~ to other seas** başqa dənizlərə çıxış yolu olmama; **6.** çayın ağzı; **7.** nəticə; **the ~ of a battle/ contest** döyüşün/ yarışın nəticəsi; **to bring *smth.* to a successful ~** bir şeyi müvəffəqiyyətlə qurtarmaq; **in the ~** nəticədə, son nəticədə; **8.** mübahisəli məsələ, müzakirə/ mübahisə obyekti; **material/immaterial ~** *hüq.* əhəmiyyətli/əhəmiyyətsiz etiraz *(məhkəmə gedişində)*; **to debate an ~** mübahisəli məsələni müzakirə etmək; **to bring an ~ to a close** mübahisəni qurtarmaq, mübahisəyə son qoymaq; **9.** *hüq.* nəsil, övlad, uşaqlar; **to die without ~** övladsız/uşaqsız ölmək;

◊ **to be at/in ~ 1)** küsülü olmaq, müxtəlif fikirlərə malik olmaq; **2)** mübahisə/ müzakirə obyekti olmaq; **the point/the matter at ~** müzakirə/mübahisə obyekti; **to put *smth.* to the ~** bir şeyi müzakirəyə qoymaq; **to take ~** razılaşmamaq, bir şeyə qol qoymamaq; **to join/to take ~ with *smb.* on *smth.*** bir kəslə bir şeyi mübahisə etməyə başlamaq

**issue²** ['ısju:, 'ıʃju:] *v* **1.** buraxmaq, vermək, dövriyyəyə buraxmaq *(pulu və s.)*; **to ~ money /stamps** pul/markalar buraxmaq; **to ~ orders /instructions** sərəncamlar/təlimatlar vermək; **2.** nəşr/çap etmək *(kitab, məqalə və s.)*; **to ~ a revised edition of a textbook** dərsliyin yenidən işlənmiş nəşrini çap etmək; **to ~ a newspaper/a dictionary** qəzet/lüğət çap etmək; **3.** çap/ nəşr olunmaq, işıq üzü görmək; **4.** vermək, dərc etmək; **to ~ orders** sərəncamlar vermək; **5.** çıxmaq, axmaq, gəlmək; *Smoke issued from the chimney Tüstü borudan/buxarıdan çıxırdı; Blood issues from a wound Yaradan qan axır; A strange noise issued from the darkness Qaranlıqdan əcaib /qəribə bir səs gəldi; No words issued from her lips Onun ağzından bir söz də çıxmadı*; **6.** qurtarmaq, başa çatmaq, tamamlanmaq, bitmək; *I hope our work will issue well Mən ümid edirəm ki, bizim işimiz müvəffəqiyyətlə başa çatacaq; The game issued in a tie Oyun heç-heçə qurtardı*; **7.** vermək, təmin etmək; **to ~ provisions/ ammunition to troops** ordunu ərzaqla/ sursatla təmin etmək; **to ~ food and clothing to soldiers** əsgərlərə yemək və geymək vermək

**issueless** ['ısjulıs] *adj* **1.** övladsız, uşaqsız; *Both their daughters were issueless Onların hər iki qızı övladsız idi*; **2.** sonsuz, doğmayan

**-ist** [-ıst] *suff. İsim köklərindən isim düzəldən şəkilçidir:* colon**ist** müstəmləkəçi; art**ist** rəssam; dent**ist** dentist, diş həkimi; pian**ist** pianoçu; dramat**ist** dramaturq; commun**ist** kommunist; social**ist** sosialist; athe**ist** ateist

**isthmus** ['ısməs] *n* **1.** *coğ.* boyun, bərzəx; **the Isthmus of Panama** Panama boynu; **2.** *anat.* buğum, boğaz

**it** [ıt] *pers. pron.* o; ona, onu; *Whose pen is this? It's mine Bu kimin qələmidir? O, mənimkidir; There is a rosebush near the fence and it is very beautiful Hasarın yaxınlığında bir qızılgül kolu var, o, çox gözəldir; Where is my dinner? The cat has eaten it Mənim naharım hanı? Onu pişik yeyib; There is a beautiful picture on the wall. Look at it Divarda gözəl bir şəkil var. Ona bax/baxın;* **It** *əvəzliyi aşağıdakı hallarda işlədilir:* **1)** *cinsi danışana məlum olmayan isimlərin əvəzinə: I looked at the baby, it was sleeping Mən körpəyə baxdım, o yatırdı;* **2)** *Fiziki baxımdan zəif və ya zərif olan isimlərin əvəzinə: There is a mouse in the kitchen, it has eaten the cheese Mətbəxdə siçan var. O, pendiri yeyib; Soon the moon rose, it was very beautiful Tezliklə ay çıxdı, o çox gözəl idi;* **3)** *Şəxssiz cümlələrin mübtədası funksiyasında. Bu halda* **it** *əvəzliyi Azərbaycan türkcəsinə tərcümə edilmir: It is spring now İndi bahardır; It is morning Səhərdir; It is late Gecdir; It is cold Soyuqdur; It is five o'clock Saat beşdir; It is snowing Qar yağır;* **4)** *Cümlənin başlanğıcında formal mübtəda rolunda işlənir. Bu halda da* **it** *əvəzliyi Azərbaycan türkcəsinə tərcümə edilmir: It is necessary for him to stay at home Ona evdə qalmaq lazımdır; It is impossible for me to go home now İndi mənim evə getməyim mümkün deyil;* **5)** *Konstruksiyalarda mənanı qüvvətləndirmək üçün: It was Tom who saved me Məni xilas edən Tom idi*

**Italian¹** [ı'tæljən] *n* **1.** italiyalı, İtaliya vətəndaşı; **the ~s** *top.i* italyanlar, İtaliyalılar; **2.** italyan dili

**Italian²** [ı'tæljən] *adj* İtaliya, italyan; **the ~ language** italyan dili

**italic** [ı'tælık] *adj poliqr.* kursiv; **~ type** kursiv; **to write in ~ script** kursivlə yazmaq; *This sentence is in italic type Bu cümlə kursivlə yazılıb*

**italicise** [ı'tælısaız] *v* = **italicize**

**italicize** [ı'tælısaız] *v* **1.** kursivlə yazmaq/ ayırmaq; **2.** altından cızmaq/xətt çəkmək *(sözün, cümlənin və s.)*; **to ~ a word** sözün altından xətt çəkmək

**italics** [ı'tælıks] *n poliqr.* kursiv; **to be in ~** kursivlə verilmək/yazılmaq; *Examples in this dictionary are in italics Bu lüğətdə misallar kursivlə verilib*

**itch¹** [ıtʃ] *n* **1.** gicişmə, qaşınma; **to have/to suffer from the ~** qaşınma/gicişmə hiss etmək, qotur xəstəliyinə tutulmaq; **the ~** *tib.* qotur; **2.** şiddətli arzu/həvəs/istək, ehtiras, şövq; **an ~ for money /gold** pula/ qızıla ehtiras; **an ~ to explore** tədqiqat ehtirası/həvəsi/şövqü

**itch²** [ıtʃ] *v* **1.** gicişmək, qaşınmaq; göynəmək, gicişmə/qaşınma hiss etmək; **to ~ all over** bütün hər yeri qaşınmaq/ gicişmək; *My nose is itching Burnum qaşınır; Mosquito bites itch terribly Ağcaqanad dişləyi bərk/yaman qaşınır;* **2.** *məc.* gicişmək; *My hands itch to give him a thrashing Əllərim gicişir, istəyirəm onu əzişdirim;*

◊ **to scratch one where one ~es** bir kəsə xidmət göstərmək, bir kəsə güzəştə getmək/üz vermək

**itchiness** ['ıtʃınıs] *n* **1.** qaşınma, gicişmə; qoturluq; **2.** *məc.* coşğun həvəs/istək

**itching** ['ıtʃıŋ] *adj* qaşınan, gicişən

**itchy** ['ıtʃı] *adj d.d.* **1.** qaşınan, gicişən; **an ~ nose** qaşınan/gicişən burun; **to feel ~ all over** hər yeri qaşınmaq/gicişmək; **2.** qotur, qoturlu, qoturdan əziyyət çəkən

**-ite** [-aıt] *suff. Ümumi və xüsusi isim köklərindən isim düzəldir:* labour**ite** leyborist *(İngiltərədə leyborist partiyasının üzvü)*; Moscov**ite** moskvalı; Hitler**ite** Hitlerçi; graph**ite** qrafit; dynam**ite** dinamit

**item¹** ['aıtəm] *n* **1.** maddə, bənd, paraqraf; məsələ; **the first ~ of the agenda** gündəliyin birinci məsələsi/bəndi; **to answer the letter ~ by ~** məktuba bənd-bənd cavab vermək; **2.** *məc.* mənbə; **the ~ of income** gəlir mənbəyi; **3.** məlumat, xəbər; kiçik məqalə *(qəzetdə)*; *There were several items in yesterday's newspaper Dünənki qəzetdə bir neçə məlumat vardı*; **local ~s** yerli məlumatlar; **4.** ayrı-ayrı fənlər *(siyahıda)*; **to number the ~s in a catalogue** kataloqda fənləri nömrələmək; **5.** məlumat vahidi *(hesablayıcı texnikada)*

**item**[2] [ˈaɪtəm] *v* yazmaq, qeyd etmək, bəndlər üzrə müəyyən etmək

**item**[3] [ˈaɪtəm] *adv* habelə, həmçinin, eyni zamanda; da, də; bundan əlavə/başqa

**itemise** [ˈaɪtəmaɪz] *v* = **itemize**

**itemize** [ˈaɪtəmaɪz] *v* **1.** bənd-bənd saymaq/vermək/qeyd etmək; siyahı tutmaq *(bir şey barədə)*; **to ~ a bill** ətraflı hesabat yazmaq; **2.** dəqiqləşdirmək, dürüstləşdirmək, müəyyənləşdirmək; təfsilatı ilə göstərmək, detallaşdırmaq; **to ~ costs/ charges** hər bir şeyin qiymətini/dəyərini ayrılıqda dəqiqləşdirmək

**itinerant**[1] [aɪˈtɪnərənt] *n* səyyah, səyahət edən adam, gəzən/gəzərgi adam, səyahətçi

**itinerant**[2] [aɪˈtɪnərənt] *adj* səyahət edən, gəzən, gəzərgi, səyyar; ~ **musicians** səyyar/gəzərgi musiqiçilər

**itinerary** [aɪˈtɪnərərɪ] *n* **1.** marşrut, yol, gediləcək yol; **2.** yol qeydləri; **3.** soraq kitabçası; **4.** marşrutun planı, nəzərdə tutulan marşrut

**itinerate** [ɪˈtɪnəreɪt] *v* **1.** səyahət etmək, gəzmək, gəzib dolaşmaq; səfil-sərgərdan gəzmək, veyillənmək, avaralanmaq; **2.** keçmək, keçib getmək *(müəyyən ərazini)*; **3.** öz ərazisini gəzib dolanmaq *(hakim, təbliğatçı, həkim və s. haq.)*

**its** [ɪts] *poss pron* öz, özünün; onun; ~ -ını, -ini, -unu, -ünü; *The child showed the teacher its first drawing Uşaq* **özünün** *çəkdiyi birinci* **şəklini** *müəllimə göstərdi; The horse broke its leg At* **qıçını** *sındırdı; The cat drank its milk Pişik süd***ünü** *içdi*

**it's** [ɪts] **it is** *birləşməsinin qısa forması*

**itself**[1] [ɪtˈself] *refl. pron Əşya, heyvan adlarına, bəzən isə uşaqlara aid işlənir:* öz, özünü, özünün; *The child showed me its toy Uşaq öz/özünün oyuncağını mənə göstərdi; The hare hides itself Dovşan özünü gizlədir; The monkey saw itself in the mirror Meymun özünü güzgüdə gördü*

**itself**[2] [ɪtˈself] *emph. pron* özü; *The house itself is not worth much but the land is valuable Ev özü bir şey deyil, lakin torpaq çox qiymətlidir*; **by ~** öz-özünə; *The light went out by itself İşıq öz-özünə söndü*

**I've** [aɪv] *d.d.* **I have** *birləşməsinin qısa forması*

**-ive** [-ɪv] *suff. fel köklərindən düzəldilən nisbi sifətlərdə təsadüf edilir*: act**ive** aktiv; decept**ive** aldadıcı; impress**ive** təsirli, ifadəli

**ivory** [ˈaɪvərɪ] *n* **1.** fil sümüyü; **a ban on the ~ trade** fil sümüyü alverinə qadağa qoyma; **2.** fil sümüyündən hazırlanmış/ qayrılmış şeylər; **3.** fil sümüyü rəngi

**ivy** [ˈaɪvɪ] *n bot.* sarmaşıq

**-ize** [aɪz] *suff. isim və sifət köklərindən fel düzəldən şəkilçi*: dramat**ize** dramlaşdırmaq; americ**anize** amerikanlaşdırmaq; modern**ize** müasirləşdirmək; critic**ize** tənqid etmək



# Jj

**J, j** [dʒeɪ] *n (pl* **J's, j's** [dʒeɪz] *ingilis əlifbasının 10-cu hərfi*

**jab**[1] [dʒæb] *n* **1.** təkan, itələmə; dümsük; **to give a ~** itələmək, dümsükləmək, zərbə/dümsük vurmaq; **to give** ***smb.*** **a ~ in the ribs** bir kəsin qabırğasına dümsük vurmaq; **2.** *harb.* cida zərbəsi, cida ilə zərbə vurma; **3.** *id.* yaxın məsafədən düz zərbə endirmə *(boksda)*; **4.** *tib.* peyvənd, peyvənd etdirmə; vaksin yeritmə *(badənə)*

**jab**[2] [dʒæb] *v (-bb-)* **1.** itələmək, dürtmələmək; yumruqla vurmaq; *He jabbed his elbow into my side O, dirsəyi ilə mənim böyrümdən dümsüklədi/itələdi*; **2.** sancmaq, batırmaq *(nizəni)*, dürtmək, soxmaq *(bıçağı)*; *She nearly jabbed my eye out with her umbrella O, az qala çətirini gözümə soxmuşdu/çətirlə gözümü tökmüşdü*; **3.** *id.* yaxın məsafədən korpusa *(gövdəyə)* zərbə endirmək *(boksda)*; *The boxer jabbed at his opponent Boksçu yaxın məsafədən rəqibinin korpusuna zərbə endirdi/vurdu*

**jabber**[1] [ˈdʒæbə^r] *n d.d.* **1.** cəfəngiyyat, boşboğazlıq; boş danışıq/söhbət; **2.** mırtıldama, öz-özünə danışma, donquldanma, burnunun altında danışma; kəkələmə, pəltəkllik, dili dolaşa-dolaşa danışma; **3.** hədərən-pədərən, çərən-pərən; hədərən-pədərən/çərən-pərən danışma

**jabber**[2] [ˈdʒæbə^r] *v* **1.** cəld və anlaşılmaz tərzdə danışmaq, naqqallıq etmək, laqqırtı vurmaq, dil boğaza qoymamaq, qırıldatmaq; *They were jabbering away in a foreign language Onlar xarici/əcnəbi dildə anlaşılmaz bir tərzdə danışırdılar*; **2.** mırtıldamaq, öz-özünə danışmaq, donquldanmaq, burnunun altında danışmaq; **3.** kəkələmək, pəltəkləmək, dili dolaşa-dolaşa danışmaq; dil boğaza qoymamaq; **4.** cəfəngiyyat danışmaq

**jack**[1] [dʒæk] *n* I **1.** xalq içərisindən çıxmış adi adam; **every man ~** hər bir adi adam; **2.** domkrat *(ağır şeyləri qaldıran mexanizm)*; **3.** valet *(oyun kartında)*; **4.** *k.t.* erkək eşşək; **5.** *amer.* gecə balıq ovlamaq üçün məşəl; **6.** eşşək *(inşaat işlərində istifadə edilən skamya)*; **7.** perforator *(süxur qazmaq üçün burğu)*, deşmə çəkici;

◊ **to raise ~** *amer.* dava-qalmaqal salmaq, dava/qovğa salmaq; **to play ~ with** ***smb.*** bir kəsi aldatmaq, bir kəsə fırıldaq gəlmək; bir kəsə qarşı kələkbazlıq/biclik /hiyləgərlik etmək

**jack** [dʒæk] *n* II *dən.* bayraq, qyus *(1-ci və 2-ci dərəcəli hərbi gəmilərdə qaldırılan bayraq)*;

◊ **Union/British Jack** Birləşmiş Krallığın bayrağı; **the Black Jack** *tar.* qara pirat bayrağı

**jack**[2] [dʒæk] *v* **1.** domkratla qaldırmaq *(həm də* **to ~ up)**; **2.** *amer. d.d.* qiyməti/əmək haqqını artırmaq *(həm də* **to ~ up)**; **3.** tərk etmək, buraxmaq, atmaq; **to ~ up** ***one's*** **work** işini tərk etmək/atmaq; **4.** *d.d.* ürəkləndirmək, cəsarətləndirmək; tərəfdar/şərik olmaq, müdafiə etmək; **5.** *amer.* məşəl işığında balıq tutmaq

**jack-** [dʒæk-] *mürəkkəb sözlərin tərkib hissəsi*: **jack**ass erkək eşşək; **jack**daw dolaşa *(erkək)*; **jack**-boot uzunboğaz çəkmə; **jack**-knife qatlanan tiyəli böyük bıçaq

**jackal** [ˈdʒækɔ:l] *n zool.* **1.** çaqqal; **2.** alçaq /rəzil/ yalançı *(adam)*

**jackass** [ˈdʒækæs] *n* **1.** *zool.* erkək eşşək; **2.** axmaq, gic, rəzil, sarsaq *(adam)*

**jackboot** [ˈdʒækbu:t] *n* **1.** uzunboğaz çəkmə; **2.** *arx.* botfort *(ağzıgen uzunboğaz çəkmə)*

**jackdaw** [ˈdʒækdɔ:] *n* **1.** *zool.* dolaşa, zağça *(quş)*; **2.** *d.d.* boşboğaz, çərənçi, çoxdanışan; xəbərçi *(adam)*

**jacket**[1] [ˈdʒækɪt] *n* **1.** gödəkcə; tujurka *(pencək)*; jaket; frenç *(üstdən dörd böyük cibi olan əsgəri pencək)*; kitel *(hərbi pencək)*; **2.** dəri *(heyvanın)*; **3.** qabıq *(kartofun)*; **potatoes boiled /cooked in their ~s** qabıqlı/soyutma bişirilmiş kartof; **4.** qovluq; cild; üzlük, cild üzlüyü *(kitabın cildinin üstünə çəkilən qabıq/üzlük)*;

◊ **to dust/to thrash** ***smb.'s*** **~** bir kəsi əzişdirmək/bərk döymək/kötəkləmək

**jacket**[2] [ˈdʒækɪt] *v* gödəkcə/tujurka/jaket/kitel geyindirmək

**jacketing** [ˈdʒækɪtɪŋ] *n* **1.** pencəklik/tujurkalıq və s. material/parça; **2.** cildlik/cild çəkmək üçün material

**jack-knife** [ˈdʒæknaɪf] *n (pl* **-knives** [-naɪvz]) qatlanan tiyəsi olan iri cib bıçağı

**jackpot** [ˈdʒækpɔt] *n* cekpot *(qumar oyunlarında ortaya qoyulan pul)*

**jackstone** [ˈdʒækstoun] *n* çınqıl, xırda çay daşı

**jackstones** [ˈdʒækstounz] *n* beşdaş *(oyun adı)*

**jackstraw** [ˈdʒækstrɔ:] *n* **1.** uyuq, qorxuluq, müqəvva; **2.** heç bir rolu/əhəmiyyəti olmayan adam;

◊ **not to care a ~** əsla/qətiyyən əhəmiyyət verməmək, bir qəpiyə hesab etməmək

**Jackobinism** [ˈdʒækəbɪnɪzm] *n tar.* yakobinlik, yakobinizm, yakobinçilik

**jade** [dʒeɪd] *n* I **1.** yabı; **2.** gəzəyən qadın, fahişə, qəhbə

**jade** [dʒeɪd] *n* II **1.** jadeit *(xırda bəzək şeyləri qayrılan açıq yaşıl rəngli daş)*; **2.** yaşıla çalan rəng, nefrit rəngi

**jaded** [ˈdʒeɪdɪd] *adj* **1.** sürülüb/minilib əldən salınmış *(at haq.)*; **2.** tabsız, çox yorğun, yorulmuş, haldan / gücdən / tabdan düşmüş, üzgün, üzülmüş

**jadish** ['dʒeɪdɪʃ] *adj* 1. əldən/tabdan düşmüş *(at haq.)*; 2. əxlaqsız, tərbiyəsiz, əxlaqı pozğun *(qadın haq.)*; 3. yorğun, yorulmuş, üzgün, üzülmüş, tabsız

**jag¹** [dʒæg] *n* 1. iti çıxıntı; diş *(mişarda, daraqda və s.)*; iti/şiş zirvə *(sıldırım qayada)*; 2. diş, dişək; 3. zəncirə, naxış *(paltarda)*; 4. deşik, dəlik *(paltarda, parçada)*

**jag²** [dʒæg] *v (-gg-)* 1. diş-diş etmək/kəsmək, dəlik-dəlik etmək; 2. didib tökmək, parça-tikə etmək, parça-parça etmək/kəsmək

**jagged** ['dʒægɪd] *adj* 1. dişli, diş-diş; diş-diş edilmiş; 2. kələ-kötür, nahamar; ~ **nails** nahamar dırnaqlar

**jaguar** ['dʒægjuəʳ] *n zool.* yaquar *(Cənubi Amerika pələngi)*

**jail¹** [dʒeɪl] *n* 1. dustaqxana, həbsxana, qazamat, zindan; **to spend a year in** ~ bir il həbsxanada keçirmək; **to break** ~ həbsxanadan qaçmaq; 2. həbs cəzası; **a ten-year** ~ **sentence** onillik həbs cəzası

**jail²** [dʒeɪl] *v* həbsxanaya/dustaqxanaya salmaq, həbs/dustaq etmək

**jailbird** ['dʒeɪlbə:d] *n d.d.* 1. dustaq, məhbus; 2. qatı cinayətkar, residivist *(dəfələrlə cinayət edən adam)*

**jail-breaker** ['dʒeɪl.breɪkəʳ] *n* cinayətkar, həbsxanadan/dustaqxanadan qaçan *(adam)*

**jailer** ['dʒeɪləʳ] *n* 1. dustaqxana/həbsxana gözətçisi; 2. dustaq, məhbus

**jail-house** ['dʒeɪlhaus] *n* həbsxana, dustaqxana, qazamat, zindan

**jail-keeper** ['dʒeɪl.ki:pəʳ] *n* = **jailer** *(1-ci mənada)*

**jalousie** ['ʒælu:zi:] *n* jalyuzi *(nazik taxtadan qayrılan pəncərə örtüyü)*; pəncərə pərdəsi/taxtası

**jam¹** [dʒæm] *n* I 1. sıxma, sıxılma; qısma; əzilmə; 2. basabas, basırıq; **traffic** ~ tıxac *(küçə hərəkətində)*; 3. *amer. d.d.* çətin/ çıxılmaz vəziyyət; **to be in a** ~ çətin vəziyyətdə olmaq, çətin vəziyyətə düşmək; **to pull** *smb.* **out of a** ~ bir kəsi çıxılmaz/ çətin vəziyyətdən çıxartmaq, bir kəsi xatadan qurtarmaq; 4. *tex.* qeyri-müntəzəmlik; pozğunluq *(mühərrikin işində və s.)*; 5. qəbul etmədə və ötürmədə manеə *(radio verilişində)*; radiotexniki manеə yaratma; qarışdırma, qatışdırma *(radio verilişlərini)*

**jam** [dʒæm] *n* II mürəbbə, cem; **strawberry /apple/plum** ~ çiyələk/alma/gavalı cemi; *He spread some strawberry jam on his bread O, çörəyinin üstünə bir az çiyələk cemi çəkdi/yaxdı*

**jam²** [dʒæm] *v (-mm-)* I 1. sıxmaq, qısmaq, sıxışdırmaq; əzmək; **to** ~ *one's* **fingers in the door** barmaqlarını qapının arasında qoyub əzmək; *He jammed his fingers in the door O, barmaqlarını qapının arasında qoyub əzdi*; 2. ağzına qədər doldurmaq; *The river was jammed with logs Çay şalbanlarla dolu idi/dolmuşdu*; 3. **(into)** tıxmaq, dürtmək, soxmaq, təpmək; basmaq; **to** ~ *one's* **clothes into a small box** paltarlarını balaca bir qutuya dürtmək/təpmək; **to** ~ *one's* **hands into** *one's* **pockets** əllərini ciblərinə soxmaq/dürtmək; *We were jammed into the bus Bizi itələyib avtobusa soxdular*; 4. radio/televiziya verilişini qatmaq/ qarışdırmaq, başqa stansiyanın verilişinə manеə/əngəl törətmək; **to** ~ **foreign radio stations** xarici radiostansiyaların verilişlərini qarışdırmaq; **to** ~ **through** keçirmək, keçirtmək; **to** ~ **a bill through** *amer.* qanun layihəsini keçirmək/keçirtmək

**jam** [dʒæm] *v (-mm-)* II mürəbbə/cem bişirmək

**jam-jar** ['dʒæmdʒa:] *n* mürəbbə bankası/ küpəsi/ bərnisi; şüşə banka

**jam-nut** ['dʒæmnʌt] *n tex.* kontrqayka *(tərs yivli qayka)*

**jangle¹** ['dʒæŋgl] *n* 1. kəskin səs; 2. ahəngsiz səslərin gurultusu; qalmaqal səsi; 3. bütün zənglərin dalbadal çalınması *(kilsədə)*

**jangle²** ['dʒæŋgl] *v* ahəngsiz kəskin səs çıxarmaq; zınqıldatmaq, cingildətmək; dınqıldatmaq, danqıldatmaq

**janitor** ['dʒænɪtəʳ] *n* 1. qapıçı, dalandar; 2. *amer.* süpürgəçi, gözətçi, qarovulçu

**January¹** ['dʒænjuəri] *n (qısa forması:* **Jan***)* yanvar; **in** ~ yanvarda; *January is the first month of the year Yanvar ilin birinci ayıdır*

**January²** ['dʒænjuəri] *adj* yanvar; ~ **days** yanvar günləri

**japan¹** [dʒə'pæn] *n* qara lak

**japan²** [dʒə'pæn] *v (-nn-)* qara lak çəkmək, qara lakla laklamaq

**Japanese¹** [.dʒæpə'ni:z] *n* 1. yapon; **the** ~ *top.* i yaponlar; 2. yapon dili

**Japanese²** [.dʒæpə'ni:z] *adj* yapon; ~ **paper** yapon kağızı; **the** ~ **language** yapon dili

**Japanese³** [.dʒæpə'ni:z] *adv* yaponca; **to speak** ~ yaponca danışmaq

**japanned** [dʒə'pænd] *adj* qara lakla laklanmış /örtülmüş, qara lak vurulmuş/çəkilmiş; ~ **leather** qara lak çəkilmiş dəri

**jar¹** [dʒa:] *n* I 1. xoşagəlməz kəskin səs; cin-gildəmə, cingilti; 2. titrəmə, titrətmə; titrəyiş, əsmə; 3. sarsıma, sarsıntı; xoşagəlməz xatirə; *The news gave me a nasty jar Xəbərdən mən çox bərk sarsıntı keçirdim, Xəbər məni bərk sarsıtdı*; 4. disharmoniya, uyğunsuzluq; ixtilaf, narazılıq; küsüşmə, nifaq

**jar** [dʒa:] *n* II banka, küpə; **a** ~ **of strawberry/apricot/cornel jam** bir banka çiyələk/ərik/zoğal mürəbbəsi

**jar²** [dʒa:] *v (-rr-)* 1. xoşagəlməz kəskin səs çıxartmaq; cingildəmək; ciyildəmək; *The brakes jarred as the car suddenly stopped Maşın qəflətən dayananda tormozlar/əyləclər ciyildədi*; 2. əsdirmək, titrətmək, silkələmək; *The wind jarred the house Külək evi əsdirirdi/silkələyirdi*; 3. sarsıtmaq, heyrətə salmaq; *He was jarred by the blow O, zərbədən sarsıldı, Zərbə onu sarsıtdı*; 4. **(on, upon)** əsəbiləşdirmək, qıcıqlandırmaq; toxunmaq; **to** ~ **on** *smb.'s* **nerves** bir kəsin əsəblərinə toxunmaq; *His whistling jarred on my nerves Onun fit çalması mənim əsəblərimə toxundu, Onun fit çalması məni əsəbiləşdirdi*; 5. uyğun gəlməmək, uyuşmamaq, həmahəng olmamaq; *These colours jar sadly Bu rənglər əsla həmahəng deyil*; **to** ~ **against** *smth.* bir şeyə uyğun gəlməmək, bir şeylə uyuşmamaq; *This order jars with the rules Bu sərəncam/əmr mövcud qaydalara uyğun gəlmir*; 6. razı olmamaq, razılaşmamaq, mübahisə etmək; *Our opinions are always jar Bizim fikirlərimiz / rəylərimiz həmişə ayrılır / bir-birinə düz gəlmir*



**jarful** ['dʒa:fu] *n (pl* **-fuls***)* bir banka/küpə dolusu; **two ~s of jam** iki banka/küpə mürəbbə

**jargon¹** ['dʒa:gən] *n* 1. *dilç.* jarqon, müəyyən bir peşə/sənət sahəsində işlədilən dil; 2. *dilç.* şivə, ləhcə; 3. çərən-pərən, tartan-partan

**jargon²** ['dʒa:gən] *v* 1. jarqonda/şivədə/ ləhcədə danışmaq; 2. anlaşılmaz bir tərzdə danışmaq

**jasmine** ['dʒæsmɪn] *n bot.* jasmin *(çiçək növü)*

**jaundice¹** ['dʒɔ:ndɪs] *n* 1. *tib.* sarılıq, sarılıq xəstəliyi/azarı; 2. qibtə, qısqanclıq; ətiacılıq, qanıacılıq; 3. qabaqcadan yanlış fikirdə/rəydə olma

**jaundice²** ['dʒɔ:ndɪs] *v* 1. *tib.* öd buraxmağa /öd gəlməsinə səbəb olmaq; 2. qəzəb/kin/ hiddət oyatmaq; qibtə/qısqanclıq oyatmaq

**jaundiced** ['dʒɔ:ndɪst] *adj* 1. sarılıq xəstəliyinə tutulmuş, sarılıq xəstəliyi olan; 2. sarı rəng; 3. ətiacı, qanıacı; qısqanc; paxıl; **a** ~ **eye** qısqanc/paxıl baxış; **to take a** ~ **view of** *smth.* bir şeyə qərəzlə/qısqanclıqla baxmaq

**jaunt¹** [dʒɔ:nt] *n* əyləncəli/könülaçan gəzinti; *He's gone on a jaunt to town O, əyləncə üçün şəhərə gəzintiyə çıxıb/gedib*

**jaunt²** [dʒɔ:nt] *v* 1. əyləncə üçün gəzintiyə çıxmaq, gəzib dolanmaq, ayaqseyrinə çıxmaq; 2. *arx.* at oynatmaq

**jauntily** ['dʒɔ:ntɪlɪ] *adv* 1. cəld, çevik, oynaq; həyəcanla, ruh yüksəkliyi ilə, vəcdlə; şadyana, sevincək, sevinə-sevinə, şən, şad; 2. laqeyd, qayğısız, dərdsiz-qəmsiz; 3. özündən razı halda, məğrur-məğrur; **to stroll** ~ **down the street** məğrur-məğrur küçəaşağı getmək

**jauntiness** ['dʒɔ:ntɪnɪs] *n* 1. canlılıq; zirəklik, çeviklik, diribaşlıq, qıvraqlıq, ayıqlıq; 2. qayğısızlıq, laqeydlik, qəmsizlik, dərdsizlik; 3. özünü bəyənmə, təkəbbür, məğrurluq, lovğalıq

**jaunty** ['dʒɔ:ntɪ] *adj* 1. çevik, diri, diribaş, oynaq, qıvraq, şən, şux; **a** ~ **person** çevik/ diribaş/qıvraq adam; **a** ~ **tune** şən/şux melodiya; 2. qayğısız, dərdsiz; başısoyuq, laqeyd, səhlənkar; 3. özünübəyənən, özündən razı olan, özünü başqasından yuxarı tutan, lovğa; məğrur; utanmaz, sırtıq

**Java** ['dʒa:və] *adj* Yava; ~ **plum** Yava gavalısı

**javelin** ['dʒævlɪn] *n* cida, mizraq; **the** ~ nizə atma yarışı; *He came second in the javelin O, nizə atma yarışında ikinci oldu*

**jaw** [dʒɔ:] *n* 1. çənə; **the upper/the lower** ~ üst /alt çənə; 2. *pl.* ağız; cəhəng *(heyvanlarda)*; 3. dar çıxış *(dərədən, boğazdan, kanaldan və s.)*; 4. nalayiq/ədəbsiz/ yaramaz boşboğazlıq; 5. *tex.* məngənə; kəlbətin; qısqac;
◊ **in the ~s of death** ölümün pəncəsində; **to be in the ~s of death** ölümün pəncəsində olmaq

**jawbone** ['dʒɔ:boun] *n* çənə sümüyü

**jaw-tooth** ['dʒɔ:tu:θ] *n (pl* **-teeth** [-ti:θ]*)* azı dişi

**jay** [dʒeɪ] *n* 1. *zool.* zığ-zığ *(meşə quşu)*; 2. zəhlətökən; bezikdirici, usandırıcı, çərənçi, lağlağı, boşboğaz *(adam)*; 3. zövqsüz geyinmiş qadın; 4. sadə/sadəlövh adam

**jaywalker** ['dʒeɪ.wɔ:kəʳ] *n d.d.* ehtiyatsız piyada

**jazz¹** [dʒæz] *n mus.* caz; **modern** ~ müasir caz; **traditional** ~ ənənəvi caz

**jazz²** [dʒæz] *v* 1. caz musiqisi çalmaq; 2. caz musiqisinə oynamaq; 3. *d.d.* tərpətmək; hərəkətə gətirmək; canlandırmaq; ruhlandırmaq, təsir etmək/göstərmək *(həm də* **to** ~ **up***)*; *He gave me a glass of whisky to jazz me up Məni ruhlandırmaq üçün o mənə bir qədəh viski verdi*

**jazz-band** ['dʒæz'bænd] *n* caz dəstəsi, caz orkestri

**jazzy** ['dʒæzɪ] *adj* ala-bəzək, ala-bula, əlvan, rəngbərəng; ~ **clothes** ala-bula/ala-bəzək paltar; ~ **colours** əlvan rənglər

**jealous** ['dʒeləs] *adj* 1. qısqanc, qısqanan; **a** ~ **husband/ a** ~ **wife** qısqanc ər/arvad; *Othello was a jealous husband Otello qısqanc ər idi*; **to be** ~ **of** *smb.* bir kəsdən qısqanmaq; 2. paxıl, paxıllıq edən; **to be** ~ **of another's success/glory, etc.** başqasının müvəffəqiyyətinə/şöhrətinə *və s.* paxıllıq etmək/paxıllığı tutmaq; *He was jealous of Tom's success Tomun müvəffəqiyyətinə onun paxıllığı tuturdu*; 3. qayğıkeş, qeydkeş, qeydəqalan, qayğıçəkən; çalışqan; **a** ~ **servant** qayğıkeş/ qeydkeş qulluqçu; ~ **nurse** qeydkeş/qayğıkeş dayə; **to keep a** ~ **eye on** *one's* **property** candildən əmlakının qeydinə qalmaq/əmlakını qorumaq

**jealously** ['dʒeləslɪ] *adv* 1. qısqanclıqla; *His glance jealously followed his wife around Onun baxışları arvadını qısqanclıqla izləyirdi*; 2. paxıllıqla, həsədlə; *They jealously followed our success Onlar bizim müvəffəqiyyətimizi/nailiyyətimizi həsədlə izləyirdilər, Onlar bizim nailiyyətimizə paxıllıq edirdilər/həsəd aparırdılar*; 3. qayğıkeşliklə, qayğı ilə, qeydkeşliklə, diqqətlə; sayıqlıqla; **a** ~ **guarded secret** qayğı ilə qorunan/saxlanılan sirr; *He jealously defended the honour of his nation O öz xalqının şərəfini qayğıkeşliklə/səylə müdafiə etdi*

**jealousness** ['dʒeləsnɪs] *n* 1. qısqanclıq; 2. paxıllıq, həsəd; 3. çalışqanlıq, cəhd; qeyrət, səy, həvəs, şövq; 4. sayıqlıq, ayıqlıq

**jealousy** ['dʒeləsɪ] *n* 1. qısqanclıq; **unfounded /groundless** ~ əsassız qısqanclıq; **blind** ~ kor-koranə qısqanclıq; **the torture/torments/pains of** ~ qısqanclığın əzab-əziyyətləri; *She grew tired of her husband's blind jealousy O, ərinin kor-koranə qısqanclığından yorulmuşdu/təngə gəlmişdi*; 2. paxıllıq, qibtə, həsəd; **petty** ~ xırda

paxıllıq/ qibtə/həsəd; **to show ~ of other people's success** başqa adamların nailiyyətinə paxıllıq/qibtə etmək; 3. qayğıkeşlik, qeydkeşlik, qayğı, qayğıya/qeydə qalma; ~ **for** ***smb.'s*** **well-being** bir kəsin firavanlığının/rifahının qeydinə qalma

**jean** [dʒeɪn] *n* qalın pambıq parça

**jeans** [dʒi:nz] *n* cins *(qalın pambıq parçadan tikilmiş şalvar)*

**jeep** [dʒi:p] *n amer.* cip *(çətin yollarda gedə bilən kiçik qabaritli maşın)*

**jeer**[1] [dʒɪə<sup>r</sup>] *n* I. həqarətli/acı istehza, toxunan söz; *A blow is much sooner forgotten than a jeer* ≅ *Qılınc yarası sağalar, söz yarası sağalmaz*; 2. ələ salma, rişxənd, istehza, masqaraya qoyma; **a ~ at a speaker** natiqi ələ salma/masqaraya qoyma, natiqə rişxənd etmə

**jeer**[2] [dʒɪə<sup>r</sup>] *v* ələ salmaq, masqaraya/lağa qoymaq, istehza/rişxənd etmək; acılamaq, sancmaq; sataşmaq

**jeerer** [ˈdʒɪərə<sup>r</sup>] *n* istehzaçı, masqaraçı, adam oynadan/ələ salan

**jejune** [dʒɪˈdʒu:n] *adj* 1. zəif, cüzi; yağsız; ~ **diet** yağsız pəhriz; 2. bəhərsiz, barsız, məhsul verməyən, qeyri-məhsuldar *(torpaq haq.)*; 3. quru, maraqsız; **a ~ story** quru/maraqsız hekayə

**jejunely** [dʒɪˈdʒu:nlɪ] *adv* 1. az, cüzi, zəif, azmaz, çox az; 2. darıxdırıcı, maraqsız, cansıxıcı

**jejunity** [dʒɪˈdʒu:nɪtɪ] *n* 1. kasıblıq, yoxsulluq; azlıq, zoiflik; 2. məhsul verməzlik, qeyri-məhsuldarlıq *(torpaq haq.)*; 3. maraqsızlıq, məzmunsuzluq

**jelly** [ˈdʒelɪ] *n* 1. jele *(meyvə şirəsindən hazırlanan şirin həlməşik)*; **strawberry ~s** çiyələk jelesi; 2. cem; **plum/apple/apricot ~** gavalı/alma/ərik cemi; 3. studen *(ət və ya balıqdan bişirilən həlməşik yemək)*

**jellyfish** [ˈdʒelɪfɪʃ] *n* 1. *zool.* meduza *(bədəni həlməşik maddədən ibarət oxayaqcıqlı dəniz heyvanı)*; 2. *amer. d.d.* iradəsiz/ ağzıboş adam

**jemmy** [ˈdʒemɪ] *n* *aşp.* baş-ayaq *(xörək)*

**jennet** [ˈdʒenɪt] *n zool.* 1. alçaqboylu ispan at növü; 2. *zool.* dişi eşşək

**jeopardize, -ise** [ˈdʒepədaɪz] *v* təhlükəyə düçar etmək, təhlükə qarşısında qoymaq, təhlükəyə salmaq; **to ~** ***one's*** **life** həyatını təhlükə qarşısında qoymaq, həyatını təhlükəyə salmaq

**jeopardy** [ˈdʒepədɪ] *n* 1. təhlükə, qorxu; **to be in ~** təhlükədə olmaq, təhlükəyə məruz qalmaq; **to put in ~** təhlükəyə salmaq; 2. *hüq.* məhkəmələik, məhkəməyə aidiyyəti olma; **to be in ~** 1) ittiham olunmaq; 2) müttəhim olmaq

**jerk**[1] [dʒɜ:k] *n* I 1. kəskin hərəkət, dartınma, dartma; sıçrayış, sıçrama, təkan, itələmə; **to give a ~** 1) dartmaq, çəkmək; itələmək; 2) dartınmaq, sıçramaq, birdən atılmaq, götürülmək; **to start with a ~** sürətlə irəli atılmaq; **to stop with a ~** birdən/qəflətən dayanmaq; **to move in ~s** dartınaraq hərəkət etmək; **one-hand clean and ~** *id.* bir əllə itələmə; 2. səksənmə, diksinmə; **the ~s** konvulsiya *(qıc, qıc olma)*; 3. *amer. d.d.* küt, korazehin, kütbeyin *(adam)*; əcayib/qəribə adam; yaramaz adam; 4. kəskin replika/ atmaca; ağıllı cavab; kəskinlik; hazırcavablıq

**jerk** [dʒɜ:k] *n* II nazik-nazik kəsilərək qaxac edilmiş ət *(xüs. mal əti)*

**jerk**[2] [dʒɜ:k] *v* I 1. kəskin sürətlə dartmaq /itələmək; çevirmək, döndərmək; tullamaq, atmaq, tolazlamaq; **to ~ the bit** tilovu birdən dartmaq; **to ~ the trigger** tətiyi çəkmək; **to ~ a fish out of water** balığı cəld dartıb sudan çıxartmaq; *He jerked the door open O, kəskin surətdə qapını itələyib açdı; She jerked me out of the room O məni itələyib otaqdan çıxartdı*; 2. kəskin dartınma ilə tərpənmək; *The train jerked to a sudden stop Qatar dayanmaq üçün gözlənilmədən kəskin surətdə dartıldı*; 3. dartınmaq, dartılmaq, qeyri-ixtiyari dartılmaq; **to ~ along** dartına-dartına hərəkət etmək; *The train jerked along Qatar dartına-dartına hərəkət edir*; **to ~ out** 1) çıxartmaq, dartıb çıxartmaq; **to ~ out the pistol** tapançaya əl atmaq, tapançanı dartıb çıxartmaq; 2) kəsik-kəsik danışmaq; *He jerked out a few words O, kəsik-kəsik bir neçə söz dedi*

**jerk** [dʒɜ:k] *v* II əti nazik-nazik kəsib qaxac etmək *(xüs. mal ətini)*

**jerkwater** [ˈdʒɜ:k.wɔ:tə<sup>r</sup>] *adj amer. d.d.* balaca, kiçik; **a ~ town** balaca şəhər, əyalət şəhəri

**jerky**[1] [ˈdʒɜ:kɪ] *n* qaxac edilmiş ət *(xüs. mal əti)*

**jerky**[2] [ˈdʒɜ:kɪ] *adj* 1. kəskin dartınaraq hərəkət edən; silkələyən, silkələnən, yırğalanan; titrək; ~ **movement** titrək hərəkət; 2. qırıq-qırıq, kəsik-kəsik; ~ **speech** qırıq-qırıq/kəsik-kəsik nitq

**jerry-builder** [ˈdʒerɪ.bɪldə<sup>r</sup>] *n* keyfiyyətsiz materialdan davamsız bina tikən podratçı

**jerry-building** [ˈdʒerɪ.bɪldɪŋ] *n* 1. pis/davamsız materialdan bina tikmə; 2. davamsız tikili/bina

**jerry-built** [ˈdʒerɪbɪlt] *adj* tələsik/tələm-tələsik tikilmiş; **a ~ garage** tələm-tələsik tikilmiş qaraj

**jersey** [ˈdʒɜ:zɪ] *n* 1. cersi *(toxunma ipək, yun və s. parça və bu parçadan tikilən paltar)*; 2. toxunulmuş jaket; 3. yun iplik

**jest**[1] [dʒest] *n* 1. zarafat, hənək; **in ~** zarafatla; **to speak in ~** zarafatla danışmaq; **to say** ***smth.*** **in ~** bir şeyi zarafatla/zarafatyana demək; **a misplaced/ inappropriate ~** yersiz zarafat/hənək; 2. istehza, masqara, masqaraya qoyma, ələ salma, lağa qoyma, rişxənd; **a ~ about** ***smb./smth.*** bir kəsi/ şeyi lağa/masqaraya qoyma;.

◊ *Many a true word is spoken in jest at. söz.* ≅ *Sözün doğrusunu zarafatla deyərlər*

**jest**[2] [dʒest] *v* 1. zarafat etmək, zarafatyana söz demək; hazırcavablıq etmək; 2. **(at)** ələ salmaq, masqaraya/lağa qoymaq, istehza/rişxənd/təhqir etmək

**jest-book** [ˈdʒestbuk] *n* lətifələr toplusu *(kitab)*

**jester** [ˈdʒestə<sup>r</sup>] *n* 1. zarafatçı, masqaraçı, hənəkçi *(adam)*; 2. kloun, oyunbaz, təlxək

**jet**[1] [dʒet] *n* I 1. *miner.* qaqat, qara kəhrəba; 2. parlaq qara rəng



**jet** [dʒet] *n* II 1. reaktiv təyyarə; 2. axın, cərəyan; fəvvarə; fışqırma; **~ of blood** qan fışqırması; 3. *tex.* jiklyor *(karbüratorda: mayelərin yaxud qazların işlənməsini qaydaya salan cihaz)*; 4. forsunka *(buxar qazanlarının odluğuna, mühərriklərin silindrinə və s. maye və ya toz halında yanacaq vermək üçün cihaz)*; 5. reaktiv mühərrik; 6. *d.d.* reaktiv mərmi

**jet**[2] [dʒet] *adj* I qaqat, qaqatdan/qara kəhrəbadan qayrılmış; **~ beads** qaqat/qara kəhrəbadan qayrılmış muncuq

**jet** [dʒet] *adj* II 1. reaktiv; **~ plane** reaktiv təyyarə; **~ engine** reaktiv mühərrik; **~ booster** *av.* reaktiv sürətləndirici

**jet**[3] [dʒet] *v* **(-tt-)** 1. *d.d.* reaktiv təyyarədə uçmaq; 2. səpmək, səpələmək, çiləmək; sıçratmaq, fışqırtmaq

**jet-black** [ˈdʒetˈblæk] *n* qatran kimi qara, qapqara

**jet-fighter** [ˈdʒet.faɪtə<sup>r</sup>] *n* reaktiv qırıcı təyyarə

**jet-motor** [ˈdʒet.moutə<sup>r</sup>] *n* reaktiv motor/ mühərrik

**jetsam** [ˈdʒetsəm] *n* 1. *dan.* kritik anda batan gəmidən sahilə atılan və ya dalğa ilə sahilə gətirilən yük; 2. taleyin ora-bura atdığı adam

**jetton** [ˈdʒetən] *n* 1. nişan; 2. jeton *(metal nişan, marka, medal)*; 3. fişka *(müxtəlif oyunlarda işlədilən daş və s.)*

**jetty** [ˈdʒetɪ] *n* 1. körpü *(gəmilərin yanalması, bağlanması üçün)*; 2. dalğaqıran, bənd, damba, torpaq bənd

**Jew**[1] [dʒu:] *n* yəhudi; **the ~s** yəhudilər

**Jew**[2] [dʒu:] *adj* yəhudi; **the ~ language** yəhudi dili; **~ customs** yəhudi adətləri/ənənələri

**jewel**[1] [ˈdʒu:əl] *n* 1. qiymətli daş; daş-qaş, cavahirat; zərgərlik şeyləri/məmulatları; **real ~s** həqiqi/əsl daş-qaşlar; **false ~s** saxta/qəlp daş-qaşlar; **to wear/to put on ~s** daş-qaş geyinmək/ taxmaq; **to be laden with ~s** həddən artıq daş-qaş taxmaq/geyinmək; 2. ən qiymətli şey, sərvət, xəzinə; **a ~ of a man** qızıl kimi adam, ən əziz adam

**jewel**[2] [ˈdʒu:əl] *v* **(-ll-)** 1. qiymətli daşla/daş-qaşla bəzəmək; 2. saat mexanizminə qiymətli daş qoymaq; 3. bəzəmək, bəzək vermək/vurmaq

**jewelled** [ˈdʒu:əld] *adj* 1. daş-qaş salınmış, daş-qaşla bəzədilmiş; **a ~ dagger** daş-qaşla bəzədilmiş xəncər; **a ~ watch** daş-qaşla/brilyantla bəzədilmiş saat; 2. daşı olan *(saat haq.)*

**jeweller, jeweler** [ˈdʒu:ələ<sup>r</sup>] *n* zərgər

**jewellery,** *(həm də* **jewelry)** [ˈdʒu:əlrɪ] *n* zərgərlik şeyləri/ məmulatları

**Jewess** [ˈdʒu:ɪs] *n* yəhudi/cühud qadın/qız

**Jewish** [ˈdʒu:ɪʃ] *adj* yəhudi, cühud; **the ~ religion** yəhudi/cühud dini

**jib**[1] [dʒɪb] *n* I 1. *tex.* qaldırıcı kranın hərəkət edən hissəsi; 2. bar *(qazma maşınının və mədən kombaynının əsas kəsici hissəsi)*

**jib** [dʒɪb] *n* II 1. inad, səbat, mətanət; 2. tərs /inad / harın at

**jib**[2] [dʒɪb] *v* **(-bb-)** 1. qəflətən dayanmaq; inad/ tərslik etmək; yerində ayaq döymək *(at və s. haq.)*; 2. geri çəkilmək/durmaq; **to ~ in the face of danger** təhlükə qarşısında geri çəkilmək/durmaq; *He jibbed when I told him the price Mən ona qiyməti dedikdə o geri durdu/çəkildi*; **to ~ at** 1) geri yuvarlanmaq/getmək; 2) tərəddüd etmək, qərarsızlıq göstərmək; **to ~ at doing** ***smth.*** bir şey etməkdə/bir iş görməkdə tərəddüd etmək

**jiffy** [ˈdʒɪfɪ] *n d.d.* an, qırpım, göz qırpımı, ləhzə; **in a ~** tez, cəld, bir anda/ləhzədə, göz yumub açınca; *Wait a jiffy Bir an gözlə/gözləyin; I'll be with you in a jiffy Mən bir dəqiqəyə səninlə/sizinlə olacam*

**jig**[1] [dʒɪg] *n* 1. ciqa *(rəqs və onun üçün musiqi)*; 2. *d.d.* zarafat, hənək; fırıldaq, hiylə, kələk, hoqqa; *I don't like her jigs Mən onun hoqqalarını xoşlamıram*; 3. *zaraf.* yüngül, dəmdəməki *(adam)*, bir yerdə qərar tutmayan/oturmayan adam; 4. *tik.* tir;

◊ *The jig is up/over Oyun qurtardı, vəssalam, şüd tamam*; **to whistle ~s to a milestone** faydasız/mənasız işlə məşğul olmaq; **to sing to ~ and dance to church music** hər şeyi tərsinə/baş-ayaq etmək

**jig**[2] [dʒɪg] *v* **(-gg-)** 1. atıb-tutmaq; **to ~ a baby** ***(up and down)*** **on** ***one's*** **knees** uşağı dizi üstündə atıb-tutmaq; 2. ciqa rəqsi etmək/oynamaq

**jigger**[1] [ˈdʒɪgə<sup>r</sup>] *n* I 1. ciqa oynayan; 2. kuklalarla işləyən aktyor; 3. filiz yuyan fəhlə; çeşidləyici; 4. *amer. d.d.* içki;

◊ **not worth a ~** lüzumsuz, faydasız, gərəksiz, heç nəyə yaramayan, vecsiz

**jigger** [ˈdʒɪgə<sup>r</sup>] *n* II qısa qadın paltosu

**jigger**[2] [ˈdʒɪgə<sup>r</sup>] *v d.d.* 1. parpılamaq, atılıb-düşmək *(tora düşmüş balıq haq.)*; 2. halay vurub oynamaq

**jiggle**[1] [ˈdʒɪgl] *n* asta-asta yırğalanma/ yellənmə/ tərpənmə

**jiggle**[2] [ˈdʒɪgl] *v* 1. yavaş-yavaş yırğalanmaq/ tərpənmək/yellənmək; səndələmək; 2. asta-asta yırğalamaq/yelləmək/tərpətmək; laxlatmaq

**jihad**[1] [dʒɪˈha:d] *n* cihad, müqəddəs müharibə

**jilt**[1] [dʒɪlt] *n* 1. işvəkar, cilvəli, nazlı, qəmzəli *(ədaları ilə kişilərin xoşuna gəlməyə çalışan qadın/qız)*; yalançı/adamaldadan qadın/qız; 2. *arx.* fahişə, qəhbə; aşna, məşuqə

**jilt**[2] [dʒɪlt] *v* cəlb edib aldatmaq; **to ~** ***smb.*** **for** ***smb.*** **else** bir kəsi başqasının xatirinə atmaq

**jingle**[1] [ˈdʒɪŋgl] *n* 1. zəng səsi, zınqıltı; cingilti; cingildəmə, zınqıldama, danqıltı, danqıldama; **the ~ of bells** qumrovların/ zənglərin zınqıltısı; **the ~ of coins/keys** sikkələrin /açarların cingiltisi; 2. zınqrov, qumrov; 3. ahəng, həmahənglik, səs uyğunluğu

**jingle**[2] [ˈdʒɪŋgl] *v* 1. cingildətmək, zınqıldatmaq, danqıldatmaq; *He jingled the coins/keys in his pocket O, sikkələri/açarları cibində cingildətdi*; 2. cingildəmək, zınqıldamaq, dınqıldamaq; *Bells jingle Zənglər dınqıldayır*

**jingo**[1] [ˈdʒɪŋgou] *n* *(pl* **-ois** [ouz]) yalançı vətənpərvər

**jingo**[2] ['dʒɪŋgou] *adj d.d.* şovinist, şovinizm
**jingoism** ['dʒɪŋgouɪzm] *n* cinqoizm *(ingilis imperialistlərinin qatı şovinizmi)*; saxta/ yalançı vətənpərvərlik, şovinizm
**jingoist** ['dʒɪŋgouɪst] *n* = **jingo**[1]
**jingoistic** [ˌdʒɪŋgou'ɪstɪk] *adj* yalançı vətənpərvər, şovinist; ~ **patriotism** yalançı vətənpərvərlik; ~ **patriot** yalançı vətənpərvər
**jink**[1] [dʒɪŋk] *n* zarafat; əyləncə; **high ~s** səs-küylü əyləncə
**jink**[2] [dʒɪŋk] *v* **1.** cəld çəkilmək/hərəkət etmək, yerindən tərpənmək; **2.** qorunmaq, özünü kənara çəkmək; yaxa qurtarmaq; **3.** *av.* yayınmaq, yana çəkilmək *(ataşdan)*
**jinn** [dʒɪn] *n* **1.** cin; **2.** *top. i.* cinlər
**jinx**[1] [dʒɪŋks] *n amer.* bədbəxt/uğursuz adam
**jinx**[2] [dʒɪŋks] *v* bədbəxtlik gətirmək, gözü dəymək, gözə/nəzərə gətirmək
**jitters** ['dʒɪtəz] *n (adət.* **the** ~*) d.d.* həyəcan, təşviş, narahatlıq; **to get/to have the** ~ əsəbiləşmək, narahat olmaq, təşviş keçirmək; vahiməyə düşmək *(qorxudan)*; çaxnaşma salmaq *(həyəcandan)*; *I always get the jitters before an interview Mən həmişə intervyüdən əvvəl həyəcan keçirirəm*
**jive**[1] [dʒaɪv] *n (həm də* **the** ~*)* **1.** caz musiqisi; **2.** caz musiqiçilərinin jarqonu; **3.** boş danışıq, boşboğazlıq, çərənçilik
**jive**[2] [dʒaɪv] *v* **1.** caz musiqisi çalmaq/ifa etmək; **2.** caz musiqisinə oynamaq; **3.** naqqallıq/boşboğazlıq etmək, çənə/laqqırtı vurmaq, çərənləmək
**job** [dʒɔb] *n* **1.** iş; əmək; **odd ~s** təsadüfi işlər; *Thousands of workers lost their jobs when the factory closed Zavod bağlananda minlərlə fəhlə işini itirdi*; **to be out of** ~ işsiz olmaq; işdən çıxmaq; *He's been out of a job for six months O, altı aydır ki, işsizdir*; **2.** *d.d.* çətin iş *(həm də ~* **of work**); *I've had quite a job with him Mən onunla xeyli əlləşməli oldum; He has a job of work on his hand Onun əlində çətin/ciddi bir iş var*; **3.** iş yeri, iş; **to have a (good)** ~ yaxşı işi olmaq; **to need a** ~ *(of work)* işə ehtiyacı olmaq; **to find a** ~ *(of work)* iş tapmaq; **to give a** ~ *(of work)* iş vermək; **to do various ~s around the house** evdə müxtəlif/ cürbəcür iş görmək; *I have a few jobs to do in the house this morning Mənim bu səhər evdə görüləsi bir az işim var*; **on the** ~ işdə, iş başında
◊ **to lie down on the** ~, **to go to sleep on the** ~ işdə baş girləmək, ciddi işləməmək
**jobber** ['dʒɔbəʳ] *n* **1.** işəmuzd işləyən adam; **2.** təsadüfi işlə məşğul olan adam; **3.** dəllal *(birjada)*; **4.** topdansatışla alver edən adam; **5.** vicdansız/alçaq/insafsız işbaz
**jobbery** ['dʒɔbərɪ] *n* **1.** vəzifədən şəxsi mənfəət/ məqsəd üçün istifadə etmə; **2.** rüşvətxorluq
**jobbing** ['dʒɔbɪŋ] *n* **1.** təsadüfi/qeyri-müntəzəm iş; **2.** xırda iş/təmir; **3.** işəmuzd qaydası ilə iş; **4.** dəllallıq
**jobbish** ['dʒɔbɪʃ] *adj* **1.** şübhəli; şübhə doğuran /oyadan; **2.** vicdansız, alçaq, insafsız
**job-horse** ['dʒɔb'hɔ:s] *n* kirayə götürülmüş at
**jobless** ['dʒɔblɪs] *adj* işsiz; ~ **people** işsiz adamlar; **the** ~ *top. i* işsizlər
**joblessness** ['dʒɔblɪsnɪs] *n* işsizlik
**job-work** ['dʒɔb'wə:k] *n* dənəmuzd/işəmuzd /götürə qaydası ilə iş
**jockey**[1] ['dʒɔkɪ] *n* **1.** jokey, sürücü, minici *(cıdırda at sürən)*; **2.** yalançı, adamaldadan, hiyləgər, kələkbaz, fırıldaqçı, cüvəllağı, bic; **3.** *arx.* səfil, avara, sərsəri
**jockey**[2] ['dʒɔkɪ] *v* **1.** aldatmaq, tovlamaq, kələk/ fırıldaq gəlmək; **to** ~ *smb.* **into** *smth.***/into doing** *smth.* bir kəsi aldadaraq bir şeyi etməyə cəlb etmək; **to** ~ *smth.* **out of** *smb.* aldadaraq/ kələk gələrək bir şeyi bir kəsdən qoparmaq; **2.** əldə etmək, nail/müvəffəq olmaq, çatmaq *(məqsədinə və s.)*; **to** ~ **for position** hər vasitə ilə əlverişli mövqeyə nail olmaq
**jockey-cap** ['dʒɔkɪkæp] *n* jokey papağı
**jockeying** ['dʒɔkɪɪŋ] *n* **1.** at alveri/dəllallığı; **2.** cıdırda at sürmə; **3.** aldatma; aldanma; yalan, hiylə, kələk, fırıldaq
**jockeyism** ['dʒɔkɪɪzm] *n* jokeylərə xas olan üslub /davranış/jarqon
**jockeyship** ['dʒɔkɪʃɪp] *n* **1.** at minmə/sürmə; **2.** at minmə sənəti/ustalığı
**jocose** [dʒə'kous] *adj arx.* zarafatcıl; məzəli, gülməli; oynaq, şux, şən, işvəli, şivəli
**jocosely** [dʒə'kouslɪ] *adv arx.* zarafatla, zarafatyana, zarafat üçün, şux, şən, işvəli, şivəli
**jocoseness** [dʒə'kousnɪs] *n* zarafatcıllıq; oynaqlıq, şuxluq, işvəlilik
**jocosity** [dʒou'kɔsɪtɪ] *n* **1.** zarafatcıllıq, oynaqlıq, şuxluq; şadlıq, şənlik, nəşə, sevinc; **2.** zarafat, hənək
**jocular** ['dʒɔkjuləʳ] *adj* zarafatçı, hənəkçi, zarafatcıl, məzəli, qəribə, gülməli, maraqlı; şad, şən, şux, xoştəbiətli; komik, məzhəkəli
**jocularity** [ˌdʒɔkju'lærɪtɪ] *n* zarafatcıllıq; komiklik, məzəlilik; şadlıq, şənlik, nəşə
**jocularly** ['dʒɔkjuləlɪ] *adv* zarafatla, zarafatyana, zarayat üçün; şadyana, sevincək; sevinə-sevinə
**jocund** ['dʒɔkənd] *adj* **1.** sevincli, şad, şən, şux, xoştəbiət; **2.** zirək, diribaş, oynaq, qıvraq; **3.** zövqverən, xoşagədən, xoşagələn, ləzzətli; səfalı, nəşəli, sevindirici; gözəl, qəşəng, məlahətli
**jocundity** [dʒou'kʌndɪtɪ] *n* **1.** şadlıq, şənlik, zövq, nəşə; **2.** əyləncə, dilxoşluq; sevinc, fərəh
**jocundly** ['dʒɔkəndlɪ] *adv* **1.** şən, şad, şadyana, sevincək halda, sevinə-sevinə; vəcdlə, ruh yüksəkliyi ilə; **2.** xoş, yaxşı, gözəl
**jocundness** ['dʒɔkəndnɪs] *n* **1.** şadlıq, şənlik, nəşə, sevinc; şuxluq, diribaşlıq, çeviklik, qıvraqlıq; **2.** xoşluq, yaxşılıq, ləzzət, kef; məlahət, gözəllik
**jog**[1] [dʒɔg] *n* **1.** təkan, itələmə; silkələmə, çırpma; dirsəklə dürtmələmə/itələmə; **to give a** ~ dürtmələmək, dümsükləmək, dirsəklə dürtmə/dümsük vurmaq; *He gave the boy a jog with his elbow O, oğlana dirsəyi ilə dürtmə vurdu*; **2.**



yavaş və aramsız qaçış/yeriş *(xüs. idman etmək məqsədilə)*; *Are you coming for a jog tomorrow? Sən/Siz sabah qaçmağa gələcəksənmi?/ gələcəksinizmi?*
**jog**[2] [dʒɔg] *v (-gg-)* **1.** itələmək, dürtmələmək, silkələmək, yırğalamaq; dirsəyi ilə dümsükləmək; *I'll jog you with my elbow when it is time to go Getmək vaxtı çatanda mən səni/sizi dirsəyimlə dümsükləyəcəyəm*; **2.** tərpətmək, canlandırmaq, oyatmaq, hərəkətə gətirmək; yadına düşməyə kömək etmək; **to** ~ *smb.'s* **memory** bir kəsin yadına salmağa çalışmaq *(bir şeyi)*; *This photograph may jog your memory Bu fotoşəkil sənin/sizin yaddaşını/yaddaşınızı oyada bilər*; **3.** atıla-atıla irəliləmək/getmək; *The car jogged along the rough road Maşın kələ-kötür yolla atıla-atıla getdi*; **4.** *id.* yavaş-yavaş və uzun müddət qaçmaq *(xüs. idman etmək üçün)*; **to** ~ **around the park** parkda yavaş-yavaş uzun müddət qaçmaq; *He goes jogging every evening O, hər axşam qaçmağa gedir*; **5.** tələsmədən yavaş-yavaş getmək; **to** ~ **along, to** ~ **on** irəli hərəkət etmək; *Things are jogging along/on d.d. İşlər yavaş-yavaş irəliləyir; Time keeps jogging on Vaxt uzanır*
**join**[1] [dʒɔɪn] *n* bitişən/bitişdirilən yer, bitişmə, bitişdirmə; *The two pieces were stuck together so well that you could hardly see the join İki parça bir yerə elə yaxşı yapışmışdı ki, bitişdirilmiş yeri güclə görmək olurdu*
**join**[2] [dʒɔɪn] *v* **1.** birləşdirmək; birləşmək; bağlamaq, bitişdirmək; qoşmaq; **to** ~ **wires** məftilləri birləşdirmək; **to** ~ **one pipe to another** bir borunu başqasına birləşdirmək/bitişdirmək; **to** ~ **the two ends of the rope together** kəndirin/ipin iki ucunu bir yerə bağlamaq; *Two extra carriages were joined onto the train Qatara iki əlavə vaqon qoşdular*; **to** ~ **forces** qüvvələri birləşdirmək; **to** ~ **theory and practice** nəzəriyyəni təcrübə ilə birləşdirmək; *They joined in the struggle for peace Onlar sülh uğrunda mübarizəyə qoşuldular; Where does the path join the road? Cığır yolla harada birləşir?*; **2.** qoşulmaq, qatılmaq, iştirak etmək; getmək *(əsgərliyə)*; **to** ~ **in a game** oyuna qoşulmaq, oyunda iştirak etmək; **to** ~ **in an excursion** ekskursiyada iştirak etmək, ekskursiyaya getmək; **to** ~ **a demonstration** nümayişə qoşulmaq/qatılmaq, nümayişdə iştirak etmək; **to** ~ **a procession** mərasimdə iştirak etmək, mərasimə qoşulmaq/qatılmaq; **to** ~ **up** *d.d.* hərbi xidmətə daxil olmaq; **to** ~ **the army** hərbi xidmətə / əsgərliyə getmək;
◊ **to** ~ **battle 1)** döyüşə/vuruşa başlamaq; **2)** mübarizəyə/yarışa başlamaq; **to** ~ **hands** birləşmək, birgə hərəkət etmək, əl-ələ vermək; **to** ~ **issue 1)** mübahisədə/ müzakirədə iştirak etmək, müzakirə aparmaq; **to** ~ **issues with** *smb.* **on** *smth.* bir kəslə bir şey üstündə mübahisə açmaq/etmək; **2)** bir kəslə çəkişməyə/dartışmağa başlamaq; **to** ~ **the banner** bayraq altında birləşmək, bir kəsə birləşmək, bir kəsin tərəfini saxlamaq; **to** ~ **the colours** hərbi xidmətə daxil olmaq; **to** ~ *smb.'s* **standard** bir kəsin davamçısı olmaq
**joiner**[1] ['dʒɔɪnəʳ] *n* xarrat, dülgər
**joiner**[2] ['dʒɔɪnəʳ] *v* xarratlıq/dülgərlik etmək, xarrat /dülgər işləmək
**joinering** ['dʒɔɪnərɪŋ] *n* xarratlıq, dülgərlik; xarratlıq/dülgərlik işi
**joinery** ['dʒɔɪnərɪ] *n* **1.** xarrat/dülgər işi, xarratlıq/dülgərlik sənəti; **2.** xarrat/dülgər emalatxanası; **3.** xarratlıq/dülgərlik məmulatı
**joint**[1] [dʒɔɪnt] *n* **1.** birləşmə yeri; birləşmə, qovuşuq yeri; çatqı; **2.** *anat.* oynaq, bənd, buğum; **ankle/knee/elbow ~s** topuq/diz/ dirsək oynaqları; **out of** ~ çıxmış, burxulmuş; **to put a bone in** ~ **again** sümüyü yenidən yerinə salmaq; *She fell and put her knee out of joint O yıxıldı və dizi çıxdı/burxuldu*; **3.** doğranmış cəmdəyin bir hissəsi; bud, qol və s.; **a** ~ **of beef** bir parça mal əti; **4.** *amer.* meyxana, içkixana; qumarxana, tiryəkxana; yuva, məskən; **eating** ~ qəlyanaltı, qəlyanaltı dükanı; **5.** *tex.* həncama, şarnir; **6.** rəndə ilə yonub düzəltmə/ yonulub düzəldilmə; **7.** *bot.* bənd, buğum *(bitkilərdə)*;
◊ **the** ~ **in** *smb.'s* **armour** bir adamın zəif yeri, Axilles dabanı
**joint**[2] [dʒɔɪnt] *adj* birləşdirilmiş, birləşmiş, ümumi; birgə, vahid; ~ **efforts** birgə /birləşdirilmiş səylər/cəhdlər; ~ **opinion** ümumi fikir /rəy; ~ **account** ümumi hesabat, bankda ümumi hesab; ~ **declaration** *amer.* birgə bəyanat; ~ **resolution** *amer.* birgə qərar/qətnamə *(konqresin hər iki palatası tərəfindən qəbul edilmiş)*; ~ **authors** həmmüəlliflər, şərik müəlliflər; ortaqlı əsər yazan müəlliflər; müəlliflər kollektivi; ~ **authorship** müştərək/şərikli müəlliflik, həmmüəlliflik
**joint**[3] [dʒɔɪnt] *v* **1.** birləşdirmək; bitişdirmək; bağlamaq; bir-birinə bağlamaq; **2.** aralamaq, parçalamaq; ayırmaq *(tərkib hissələrinə)*, əti üybəüy/buğum-buğum doğramaq
**jointly** ['dʒɔɪntlɪ] *adv* birgə, birlikdə, bir yerdə, əlbir, əlbir olaraq; ~ **and separately** birgə və ayrı-ayrı; **to act** ~ birgə/əlbir hərəkət etmək
**joist** [dʒɔɪst] *n* tir, dirək
**joke**[1] [dʒouk] *n* **1.** zarafat, hənək; məzəli söz/ əhvalat; *She told some very funny jokes O, bir neçə məzəli əhvalat danışdı*; **in** ~ zarafatla, zarafatyana; **to make a** ~ zarafat etmək; **to have a** ~ **with** *smb.* bir kəslə zarafatı olmaq; **to take a** ~ zarafat götürmək; *He can't take a joke O, zarafat götürmür*; **2.** gülünc obyekti olma, oyuncaq yerinə qoyulan adam; *She is the joke of the village O, kəndin gülünc obyektidir, Ona bütün kənd gülür*;
◊ **to see the** ~ zarafatın mənasını/ dadını-duzunu anlamaq; **to play a** ~ **on** *smb.* bir kəsi lağa/araya qoymaq; **to make a** ~ **about** *smb.* bir kəsə sataşmaq; **to push/to carry the** ~ **too far** zarafatın şitini çıxartmaq

**joke**[2] [dʒouk] *v* **1**. zarafat etmək, zarafatlaşmaq; *I was only joking Mən ancaq zarafat edirdim; He's always joking O həmişə zarafat edir*; **2**. sataşmaq, lağa/araya qoymaq, ələ salmaq, cırnatmaq, acıqlandırmaq, hirsləndirmək;
◊ *Joking apart Zarafatsız, Zarafat bir yana*
**joker** ['dʒoukər] *n* zarafatçı, masqaraçı; hənəkçi, məzəli adam; istehzaçı, rişxəndçi
**joky** ['dʒoukı] *adj* zarafatcıl, məzəli, gülməli, məzhəkəli
**jokingly** ['dʒoukıŋlı] *adv* zarafatla, zarafatyana, zarafat üçün
**jolly**[1] ['dʒɔlı] *adj (-ier, -iest)* **1**. şad, şən, sevincli; fərəhli, fərəhləndirici, ürəkaçan; oynaq, şux, coşğun; mehriban; **2**. təntənəli, təmtəraqlı; gurultulu, səs-küylü; **a ~ crowd** səsli-küylü izdiham/camaat; **3**. kefli, sərxoş; **4**. xoş, xoşa-gələn, səfalı, gözəl, qəşəng, məlahətli; məzəli, kefcil; **~ weather** gözəl/qəşəng hava; **a ~ face** məlahətli üz/sifət; **a ~ fellow** məzəli/ zarafatcıl/kefcil oğlan; **a ~ girl** gözəl/qəşəng/ xoşsifət/ məlahətli qız; **to have a ~ time** vaxtını xoş/gözəl keçirmək
**jolly**[2] ['dʒɔlı] *v (pt, pp* **jollied)** **1**. mehribanlıqla / mehribancasına/nəvazişlə rəftar etmək; **2**. yaltaqlıqla/yaltaqcasına tərifləməklə nail olmaq *(bir şeyə)*; **3**. sataşmaq, lağa/araya qoymaq, ələ salmaq
**jolly**[3] ['dʒɔlı] *adv* olduqca, çox, dedikcə, son dərəcə, müstəsna dərəcədə; **a ~ good** çox yaxşı; **a ~ quick** olduqca tez/cəld; *She's a jolly good teacher O, çox/dedikcə yaxşı müəllimdir; He did jolly well in the exams O, imtahanları olduqca/ dedikcə yaxşı verdi*
**jolt**[1] [dʒoult] *n* **1**. təkan, itələmə, silkələnmə, silkələmə, yırğalama; **to give a ~ 1)** itələmək; silkələmək; silkəmək; **2)** çəkilmək, çəkib çıxarılmaq; **2**. *məc.* zərbə, sarsıntı, sarsılma; **to give a ~** sarsıtmaq; **to receive a ~** zərbə almaq, sarsıntı keçirmək
**jolt**[2] [dʒoult] *v* **1**. silkələmək, yırğalamaq, əsdirmək; çırpmaq; **2**. əsmək, titrəmək; **3**. atılıb düşə-düşə getmək/hərəkət etmək, atıla-atıla getmək
**jolty** ['dʒoultı] *adj* silkələyən; silkələnən, yırğalanan; kələ-kötür *(yol haq.)*
**jostle**[1] ['dʒɔsl] *n* **1**. təkan; itələmə, zərbə; toqquşma; **2**. basabas, basırıq, tünlük
**jostle**[2] ['dʒɔsl] *v* **1**. itələmək, dürtmələmək; *Don't jostle (against) me Məni itələmə/ itələməyin*; **2**. itələşmək, dürtmələşmək; **to ~ against** *smb.* bir kəslə itələşmək/ dürtmələşmək
**jot**[1] [dʒɔt] *n* zərrə qədər, çox az miqdar; *There's not a jot of truth in his story Onun hekayətində zərrə qədər həqiqət yoxdur*
**jot**[2] [dʒɔt] *v (-tt-)* tez/cəld/tələsik qeyd etmək; *I'll just jot down their phone number before I forget it Mən yaddan çıxartmamış onların telefon nömrəsini cəld qeyd edəcəm*
**jotter** ['dʒɔtər] *n* bloknot *(qeyd aparmaq üçün)*
**journal** ['dʒə:nl] *n* **1**. jurnal; qəzet; **a medical/a scientific ~** tibbi/elmi jurnal; **to subscribe to a medical ~** tibbi jurnala abunə yazılmaq; **2**. gündəlik; *He kept a journal of his travel across Africa O, Afrika səyahəti haqqında gündəlik yazdı/ tutdu*
**journal-book** ['dʒə:nlbuk] *n* **1**. gündəlik qeyd kitabı; jurnal; **2**. gündəlik
**journalism** ['dʒə:nəlızm] *n* **1**. jurnalist peşəsi; **2**. jurnalizm
**journalist** ['dʒə:nəlıst] *n* jurnalist, mühərrir, qəzetçi *(qəzet işçisi; qəzetsatan)*; müxbir;
◊ **yellow ~** bulvar mətbuatının müxbiri
**journalistic** [ˌdʒə:nə'lıstık] *adj* jurnalist, jurnalistlik; **his ~ skill** onun jurnalistlik bacarığı/məharəti
**journey**[1] ['dʒə:nı] *n* səfər, səyahət *(xüs. quruda)*; **a ~ of three days, three days' ~** üç günlük səfər/səyahət; **a ~ by rail** dəmir yolu ilə səyahət; **a ~ on foot** piyada səyahət; **~ to London** Londona səyahət/ səfər; **to make/to take/to go on a ~** səfərə/səyahətə çıxmaq; **to break** *one's* **~** səfərini/səyahətini dayandırmaq/yarımçıq qoymaq
◊ **to reach** *one's* **~'s end** ömrünü /həyatını başa vurmaq, dünyasını dəyişmək, ölmək
**journey**[2] ['dʒə:nı] *v* səfər/səyahət etmək, səfərə/ səyahətə çıxmaq
**journeyman** ['dʒə:nımən] *n (pl* **-men** [-mən]) **1**. muzdla usta köməkçisi işləyən ixtisaslı fəhlə və ya sənətkar; **2**. *məc.* muzdur, muzdla işləyən fəhlə; **3**. günəmuzdçu, günəmuzd işləyən fəhlə
**journey-work** ['dʒə:nıwə:k] *n* günəmuzd iş, günəmuzd görülən iş
**joust**[1] [dʒaust] *n tar.* **1**. *cəngavərlərin at üstündə təkbətək vuruşu/döyüşü*; **to engage in a ~** təkbətək vuruşda/döyüşdə iştirak etmək; **2**. *pl* yarış
**joust**[2] [dʒaust] *v* **1**. təkbətək döyüşdə vuruşmaq; **2**. yarışda iştirak etmək
**jovial** ['dʒouvjəl] *adj* **1**. şad, şux, şən, xoşxasiyyət, xoştəbiət; mehriban, ünsiyyətli; **2**. zirək, diribaş, çevik
**joviality** [ˌdʒouvı'ælıtı] *n* **1**. şadlıq, şənlik, nəşə, sevinc; **2**. mehribanlıq, adama yovuşma
**jovially** ['dʒouvjəlı] *adv* şadyana, sevinə-sevinə, sevincək; həyəcanla, ruh yüksəkliyi ilə, vəcdlə
**jovialness** ['dʒouvjəlnıs] *n* = **joviality**
**jowl** [dʒaul] *n* I *(adət. pl)* çənə; çənə sümüyü; **heavy ~s** yekə çənə; **a man with heavy ~s** yekə çənəli/yekə buxaqlı adam
**jowl** [dʒaul] *n* II *zool.* boğaz altında sallaq dəri *(bəzi heyvanlarda)*
**jowl** [dʒaul] *n* III baş *(nərə balığında, sığında)*
**joy** [dʒɔı] *n* sevinc, fərəh, şadlıq; nəşə, zövq, şənlik, əyləncə, kef, ləzzət; **to jump/to cry/to dance for/with ~** fərəhdən/sevincdən atılıb-düşmək/ağlamaq/oynamaq; **the ~ of motherhood /fatherhood** analıq/atalıq fərəhi/sevinci; **the ~s and sorrows of the life** həyatın sevincləri və kədərləri; *My children are a great joy to me Uşaqlarım mənim üçün böyük fərəhdir/sevincdir*
**joy-fire** ['dʒɔı'faıər] *n bayram münasibətilə qalanan tonqal*



**joyful** ['dʒɔıfl] *adj* **1**. sevincli, fərəhli; sevindirici, fərəhləndirici, ürəkaçan; **~ news** sevindirici/ fərəhləndirici xəbər; **to be ~** sevinmək, şadlanmaq, fərəhlənmək; **2**. bəxtiyar, xoşbəxt, uğurlu; razı, xoşhal; **~ countenance** xoşbəxt/ bəxtiyar sifət
**joyfully** ['dʒɔıfulı] *adv* şadyana, sevincək, sevinə-sevinə; xoşbəxtanə, xoşbəxtliklə
**joyfulness** ['dʒɔıflnıs] *n* şadlıq, sevinc, fərəh, nəşə, zövq, şənlik
**joy-house** ['dʒɔıhaus] *n amer.* fahişəxana, qəhbəxana
**joyless** ['dʒɔılıs] *adj* sevincsiz, fərəhsiz; qəmli, kədərli, məyus; **~ occasion** qəmli/ kədərli hadisə; **~ trip** sevincsiz/fərəhsiz səfər
**joylessly** ['dʒɔılıslı] *adv* sevincsiz, fərəhsiz, kədərlə, qəmli tərzdə, məyus-məyus, qəmli-qəmli, kədərli-kədərli
**joylessness** ['dʒɔılısnıs] *n* **1**. qəm, kədər, qüssə; **2**. sevincsizlik, fərəhsizlik, pərişanlıq, məyusluq
**joyous** ['dʒɔıəs] *adj* = **joyful**
**joyride** ['dʒɔıraıd] *n d.d. başqasının və ya dövlət maşınında kef üçün gəzintiyə çıxma (icazəsiz)*
**jubilant** ['dʒu:bılənt] *adj* şadlıq/şənlik edən; şadlanan, sevinən; **a ~ person** şadlıq/şənlik edən adam; **to be in a ~ mood** sevinmək, şadlanmaq, şad olmaq
**jubilate** ['dʒu:bıleıt] *v* şadlıq/şənlik/şadyanalıq etmək, sevinmək, şadlanmaq
**jubilation** [ˌdʒu:bı'leıʃn] *n* şadlıq, şənlik, şadyanalıq; sevinc, şadlıq/şənlik etmə, şadlanma, sevinmə
**jubilee** ['dʒu:bılı:] *n* **1**. yubiley; **silver/golden/ diamond ~** iyirmibeşillik/əlliillik/altmışillik yubiley; **2**. bayram, təntənə, şadyanalıq
**jubilize** ['dʒu:bılaız] *v* **1**. yubiley keçirmək; **2**. şadlıq/şənlik/şadyanalıq/bayram etmək
**Judaic** [dʒu:'deıık] *adj* yəhudi; **the ~ tradition** yəhudi adəti/ənənəsi
**Judaical** [dʒu:'deııkl] *adj* = **Judaic**
**Judaism** ['dʒu:deıızəm] *n* yəhudi dini
**Judas** ['dʒu:dəs] *n* **1**. *inc.* İuda; **2**. *məc.* satqın, xain
**judge**[1] [dʒʌdʒ] *n* **1**. hakim; **presiding ~** sədrlik edən hakim; **2**. arbitr, münsif; ekspert; münsiflər məhkəməsi; **3**. *id.* hakim; **~ of the course** distansiyada duran hakim; **~ at the curve** döngədə duran hakim; **~ at the finish** finişdə duran hakim; **4**. qiymət qoyan/verə bilən, yaxşı bilən /tanıyan adam; **a ~ of music** musiqini yaxşı bilən adam; **a good ~ of horse** yaxşı at tanıyan adam
**judge**[2] [dʒʌdʒ] *v* **1**. mühakimə etmək, işə baxmaq, iş kəsmək *(məhkəmədə)*; **2**. arbitr/ekspert olmaq; **to ~ at a contest** yarışa hakimlik etmək, yarışda hakim olmaq; **3**. qiymət qoymaq/vermək; **to ~** *smth.* bir şeyə qiymət qoymaq/vermək; **4**. mühakimə yürütmək, nəticə çıxartmaq; **to ~ by appearances / words/deeds** xarici görkəmdən/ sözlərdən/əməllərdən nəticə çıxartmaq; **5**. pisləmək, qınamaq, töhmətləndirmək, danlamaq
**judgement** ['dʒʌdʒmənt] *n (həm də* **judgment)** **1**. *hüq.* işə baxma/baxılma, istintaq, təhqiqat; **to sit in ~ on/upon a case** işə baxmaq; **2**. *hüq.* hökm, məhkəmənin qərarı *(həm də* **~ of court)**; **final ~** məhkəmənin son qərarı/hökmü; **~ for the defendant** cavabdehin xeyrinə çıxarılan hökm; **~ for the plaintiff** məhkəmənin iddiaçının xeyrinə çıxardığı hökm/qərar; **to pass/to give/to pronounce/ to render ~** məhkəmə hökmü çıxartmaq; **to execute /to vacate a ~** məhkəmə hökmünü icra/ ləğv etmək; **3**. tənqid, məzəmmət, töhmət; **to pass ~ on/upon** *smb.* bir kəsi tənqid/məzəmmət etmək; **4**. fikir, hökm; **private ~** şəxsi/xüsusi fikir; **to form a ~** fikir yaratmaq; **5**. düşüncəlilik, ağıllılıq, mühakiməlilik; düşüncə, dərrakə, idrak; **a man of sound/good ~** sağlamfikirli/ sağlamdüşüncəli adam
**judgemental** [ˌdʒʌdʒ'mentl] *adj* tənqidi; **~ attitudes** tənqidi münasibətlər
**Judgement Day** ['dʒʌdʒment deı] *n din. (həm də* **the Day of Judgement, the Last Judgement)** məşhər, qiyamət günü, dünyanın axırı/sonu
**judicature** ['dʒu:dıkətʃər] *n* **1**. *hüq.* məhkəmə üsulu; **2**. *hüq.* məhkəmə quruluşu/ təşkilatı/sistemi; **3**. hakim rütbəsi
**judicial** [dʒu:'dıʃl] *adj* **1**. məhkəmə; **~ court** məhkəmə; **a ~ system/inquiry** məhkəmə sistemi/istintaqı; **the ~ process** məhkəmə prosesi, məhkəmənin gedişi; **2**. düşüncəli, ağıllı, dərrakəli, mühakiməli, ehtiyatlı; **a man with a ~ mind** düşüncəli /dərrakəli/mühakiməli adam
**judicially** [dʒu:'dıʃəlı] *adv* məhkəmə vasitəsilə/yolu ilə
**judicious** [dʒu:'dıʃəs] *adj* sağlamfikirli, sağlamdüşüncəli, açıqfikirli, ağlı başında, düşüncəli, ağıllı, dərrakəli, mühakiməli, kamallı
**judiciously** [dʒu'dıʃəslı] *adv* ağılla, ağıllı, düşüncə ilə, fərasətlə, düşünərək
**judo** ['dʒu:dou] *n* cudo *(yapon güləşi)*
**jug**[1] [dʒʌg] *n* I bardaq; krujka, parç, küpə, tayqulp *(su qabı)*; **a ~ of beer** bir parç/ krujka pivə; **a milk/water ~** süd/su bardağı; **to pour milk /water from a ~** bardaqdan süd/su tökmək
**jug** [dʒʌg] *n* II ötmə, oxuma, cəh-cəh vurma *(bülbül və başqa quşlar haq.)*
**jug**[2] [dʒʌg] *v* I **1**. *aşp.* küpədə bişirmək/ pörtlətmək; **2**. *jarq.* həbsxanaya salmaq
**jug** [dʒʌg] *v* II oxumaq, ötmək, cəh-cəh vurmaq *(bülbül və digər quşlar haq.)*
**jugful** ['dʒʌgful] *n* bir bardaq, bir parç, bir krujka; **a ~ of beer** bir krujka dolusu pivə
**juggle**[1] ['dʒʌgl] *n* **1**. fokus, kələk, hiylə; **2**. aldatma, yalan; kələkbazlıq, biclik, fəndgirlik
**juggle**[2] ['dʒʌgl] *v* **1**. jonqlyorluq etmək *(məharətlə əldə şey oynatmaq)*; **2**. aldatmaq, kələk/hiylə fırıldaq gəlmək; **to ~ with** *smb.* bir kəsi aldatmaq, bir kəsə kələk/hiylə gəlmək; **to ~** *smb.* **out of** *smth.* bir şeyi bir kəsdən aldadıb/tovlayıb almaq; **to ~** *smb.* **into doing** *smth.* kələklə/hiylə

ilə bir kəsi bir şey etməyə vadar etmək; **to ~ with words** sözlərin mənasını təhrif etmək; **to ~ with facts** faktları qəsdən təhrif etmək

**juggler** ['dʒʌglə(r)] *n* jonqlyor *(sirkdə məharətlə əldə şey oynadan artist)*, fokusçu *(fokuslar göstərən estrada, sirk artisti)*; hoqqabaz, oyunbaz, akrobat; **2**. yalançı, fırıldaqçı, hiyləgər, kələkbaz, cüvəllağı

**jugglery** ['dʒʌgləri] *n* **1**. jonqlyorluq, jonqlyorluq etmə, fokus göstərmə; **2**. yalan, hiylə, kələk, fırıldaq, kələkbazlıq, biclik, hiyləgərlik, fırıldaqçılıq; faktları saxtalaşdırma; **political ~** siyasi kələkbazlıq /hiyləgərlik/fırıldaqçılıq

**jugular** ['dʒʌgjulə(r)] *adj anat.* boyun; **~ vein** boyun venası

**juice** [dʒu:s] *n* **1**. şirə; **lemon/orange/ apple /tomato,** ***etc.*** **~** limon/portağal/alma/ pomidor *və s.* şirəsi; **2**. *adət. pl fiziol.* şirə; **gastric/digestive ~s** mədə şirəsi; **3**. *d.d.* yanacaq, benzin, petrol; *We ran out of juice on the motorway Avtomagistralda bizim yanacağımız/benzinimiz qurtardı*; **4**. mahiyyət, məğz, mətləb

**juiced** [dʒu:st] *adj* şirəli, sulu; **~ fruits** şirəli/sulu meyvələr

**juiceless** ['dʒu:slıs] *adj* **1**. şirəsiz, quru; **2**. *d.d.* yanacaqsız, benzinsiz; **3**. cərəyansız, cərəyanı kəsilmiş

**juicer** ['dʒu:sə(r)] *n* şirəçıxardan, şirəsıxan *(cihaz)*

**juiceness** ['dʒu:snıs] *n* şirəlilik, sululuq

**juicy** ['dʒu:sı] *adj (***-ier, -iest***)* **1**.şirəli, sulu; **fresh ~ oranges** təzə şirəli/sulu portağallar; **2**. maraqlı, maraq doğuran; **~ gossip** maraqlı/maraq doğuran qeybət; **3**. *d.d.* nəm, rütubətli, yağışlı *(hava haq.)*; **4**. mənalı, məzmunlu *(mühazirə və s. haq.)*;

◊ **~ story** maraqlı/maraq doğuran/oyadan əhvalat/hekayə

**Jul** [dʒu'laı] *n* **July** *isminin qısa forması*: **21 Jul 1882** 21 iyul 1882-ci il

**July**[1] [dʒu'laı] *n (qısa forması* **Jul***)* iyul *(ilin 7-ci ayı)*; **in ~** iyulda, iyul ayında

**July**[2] [dʒu'laı] *adj* iyul; **~ days** iyul günləri

**jumbal** ['dʒʌmbl] *n* şirin kökə/qoğal

**jumble**[1] ['dʒʌmbl] *n* **1**. qarışıq topa/yığın/ qalaq; **a ~ of books and papers** kitab və kağızların qarışıq topası/yığını; *Can you form a word from this jumble of letters Bu qarışıq hərflərdən söz düzəldə bilərsənmi?/bilərsinizmi?*; **2**. qarışıqlıq, dolaşıqlıq; səliqəsizlik, nizamsızlıq; **3**. silkələmə, əsdirmə, yırğalama; silkələnmə, yırğalanma, əsmə; **4**. *d.d.* miniklə getmə/ gediş

**jumble**[2] ['dʒʌmbl] *v* **1**. qarışdırmaq, dolaşdırmaq *(əsas.:* **to ~ together/up***)*; **2**. qarışmaq, qatışmaq; **3**. nizamsız bir tərzdə irəliləmək; itələşmək; **4**. silkələnmək, atılıb-düşmək *(minikdə və s.)*

**jumbo** ['dʒʌmbou] *n (pl* **-os***)* **1**. bir neçə yüz sərnişin götürə/daşıya bilən təyyarə, *xüs.* Boyinq 747; **2**. ağır/ləng/yöndəmsiz /biçimsiz adam /heyvan; çox yekə/çox ağır şey

**jump**[1] [dʒʌmp] *n* **1**. atılma, hoppanma, tullanma, sıçrama; sıçrayış; **at a ~** bir tullanmada/sıçrayışda; **to give/to take a ~** atlanmaq, atılmaq, hoppanmaq, tullanmaq, sıçramaq; **high/long ~** yüksəkliyə /uzunluğa tullanma; **standing/running ~** yerində/qaçaraq tullanma; **parachute ~** paraşütdən tullanma/atılma; **2**. sıçrayış, gözlənilmədən/qəfildən yüksəlmə/qalxma; **a great ~ forward in technology** texnologiyada irəliyə doğru böyük sıçrayış; **to give a ~** birdən-birə /gözlənilmədən qalxmaq; *The temperature gave a jump Temperatur birdən-birə kəskin surətdə qalxdı/ yüksəldi*; **~ in prices** qiymətlərdə kəskin qalxma; **3**. *id.* manеə; *The horse fell at the last jump At sonuncu/axırıncı manеədə yıxıldı*;

◊ **to get/to have the ~ on** ***smb.*** bir kəsdən üstün olmaq; **from the (very) first ~** lap əvvəldən/başlanğıcdan; **on/ upon the ~ 1)** zirək, çevik, diribaş, cəld; **2)** çox məşğul; **3)** həmişə hərəkətdə/ayaqüstə olan

**jump**[2] [dʒʌmp] *v* **1**. atlanmaq, atılmaq, hoppanmaq, tullanmaq, sıçramaq; **to ~ high** hündürə hoppanmaq/ tullanmaq; **to ~ out of the window /over the wall** pəncərədən /divarın üstündən hoppanmaq; *She has jumped 2.2 metres O, 2.2 metr hoppanıb*; **to ~ up and down** atılıb-düşmək; **to ~ up and down for/with joy** sevincdən atılıb-düşmək; *The children were jumping up and down with joy Uşaqlar sevincdən atılıb-düşürdülər*; **2**. dik atılmaq; **to ~ to** ***one's*** **feet** ayağı üstə atılmaq; *He jumped to his feet as the boss came in Bos içəri girəndə o dik atıldı*; **3**. atılıb-keçmək *(həm də* **to ~ over***)*; **to ~ over a line/a ditch** kəndirin/xəndəyin üstündən atılmaq/ hoppanmaq; **to ~ the rails** relsdən çıxmaq *(qatar haq.)*; **4**. *məc.* keçmək; **to ~ from one subject to another** bir mövzudan başqasına keçmək; **5**. hoppanmağa/ tullanmağa məcbur etmək; **to ~ a horse (over a fence)** atı *(hasarın üstündən)* hoppanmağa/ tullanmağa məcbur etmək; **6**. tərpətmək, əsdirmək; **to ~ a table** stolu tərpətmək; **7**. kəskin sürətdə qalxmaq *(qiymət, hərarət və s.)*; *The temperature has jumped Temperatur kəskin surətdə qalxıb; Wool jumped up to... Yunun qiyməti... qədər qalxdı*; **8**. qaldırmaq, artırmaq, yüksəltmək *(qiyməti)*; **9**. incitmək, sızıldamaq *(diş haq.)*; **10**. uyğun gəlmək, üst-üstə düşmək; *Our opinions jump together/one with another Bizim fikirlərimiz bir-biri ilə uyğun gəlir/üst-üstə düşür*; **11**. üstünə atılmaq; *The thieves jumped him in a dark street Oğrular qaranlıq bir küçədə onun üstünə atıldılar*; **12**. qaçmaq, qaçıb canını qurtarmaq, əkilmək; **to ~ town** şəhərdən qaçmaq/əkilmək; **to ~ at** ***smth.*** bir şeydən bərk-bərk yapışmaq, bir şeyi həvəslə qəbul etmək; **to ~ at an offer/at a chance** təklifdən/imkandan bərk-bərk yapışmaq; **to ~ at** ***smb.*** bir kəsin üstünə atılmaq, bir kəsi qucaqlamaq; **to ~ on/upon** ***smb.*** **1)** bir kəsi danlamaq/yamanlamaq; *The teacher*



*jumped on the inattentive pupil Müəllim diqqətsiz şagirdi danladı*; **2)** qəflətən bir kəsin üstünə atılmaq; **to ~ about 1)** atılıb-düşmək *(ağrıdan, sevincdən)*; narahat olmaq; *Don't jump about so much Bu qədər atılıb-düşmə/atılıb-düşməyin!*; **2)** vurnuxmaq, boş-boşuna əlləşmək/çalışmaq; **to ~ down 1)** tullanmaq, hoppanmaq, atılmaq *(aşağı)*; **2)** tullanmağa/hoppanmağa kömək etmək *(uşağa və s.)*; **to ~ in** suya tullanmaq/atılmaq; *He jumped in to save a child O, suya atıldı ki, uşağı xilas etsin*; **to ~ up** dik atılmaq; *He jumped up from his seat O, yerindən dik atıldı*;

◊ **to ~ the queue** növbəni pozmaq, növbəsiz almaq *(bir şeyi)*; **to ~ at the bait** tələyə düşmək; **to ~ into** ***one's*** **clothes** tələsik/cəld geyinmək; **to ~ down** ***smb.'s*** **throat** bir kəsin sözünü kəsmək, bir kəsə danışmağa imkan verməmək;

◊ **to ~ out of the frying-pan into the fire** *at. söz.* ≅ *Yağışdan çıxıb yağmura düşmək*

**jumper**['dʒʌmpə(r)] *n* I **1**. hoppanma mütəxəssisi olan idmançı; **2**. hoppanan həşərat *(birə, çəyirtkə və s.)*; **3**. *av.* paraşütçü; **4**. *id.* manеələri keçə bilən at; **5**. *amer.* başqasının torpaq sahəsini zəbt edən/tutan adam; **6**. *amer.* kirşə, xizək

**jumper**['dʒʌmpə(r)] *n* II **1**. cemper *(yun və ya ipəkdən toxunma kofta/jilet)*; **2**. dənizçi köynəyi; **3**. iş bluzası *(üst köynəyi)*

**jumpy** ['dʒʌmpı] *adj* **1**. narahat, əsəbi; həyəcanlı, təlatümlü; *Wall Street is getting jumpy Vol Strit narahat/təlatümlü vəziyyət alır*; **2**. kələ-kötür, əyri-üyrü, nahamar; **3**. əsəbə toxunan, əsəbiləş-dirən; **4**. enib-qalxan, sıçrayışlı, qeyri-sabit *(qiymət, temperatur və s. haq.)*

**junction** ['dʒʌŋkʃn] *n* **1**. birləşmə; ittifaq; koalisiya; **~ of talent and experience** istedadın və təcrübənin birləşməsi; **~ of two states** iki dövlətin koalisiyası/ittifaqı; **to make a ~** birləşmək; **2**. qovşaq; **railway ~** dəmiryol qovşağı; **3**. kəsişmə *(yolda)*; yolayrıcı; dörd yol ağzı; **4**. dəmir yollarının kəsişməsi; **5**. qarışma, qovşaq yeri *(çayda)*

**juncture** ['dʒʌŋktʃə(r)] *n* **1**. birləşmə; **2**. birləşmə yeri; çarpazlaşma; kəsmə; qovuşma; **at the ~ of one river with another** iki çayın birləşməsində/qovuşduğu yerdə; **3**. işlərin vəziyyəti; **critical ~ of things** işlərin kritik vəziyyəti; **at this ~** bu vəziyyətdə; **4**. *tex.* qaynaq/bənd yeri

**Jun** [dʒu:n] *n* **June** *isminin qısa forması*

**June**[1] [dʒu:n] *n* iyun; **in ~** iyunda

**June**[2] [dʒu:n] *adj* iyun; **~ days** iyun günləri

**jungle** ['dʒʌŋgl] *n* **1**. cəngəl, cəngəllik, qalın meşəlik/kolluq; **2**. *amer.* qumarxana, tiryəkxana; **3**. səfillər və işsizlər üçün yataqxana;

◊ **the law of the ~** cəngəllik qanunu

**jungled** ['dʒʌŋgld] *adj* qalın kol-kosla/qalın meşə ilə örtülmüş

**junior**[1] ['dʒu:njə(r)] *n* **1**. kiçik, balaca; **to be** ***smb.'s*** **~** bir kəsdən kiçik olmaq; *The girl is his junior by two years Qız ondan iki yaş kiçikdir*; **2**. tabeçilikdə olan; *He is my junior O mənim tabeçiliyimdədir*; **3**. *amer.* son kursdan əvvəlki kursda olan tələbə

**junior**[2] ['dʒu:njə(r)] *adj* **1**. kiçik, balaca *(qardaş, bacı)*; **John Smith ~** kiçik Con Smit; **2**. gənclər; **~ book** gənclər üçün kitab; **~ library** gənclər üçün kitabxana; **~ swimming championships** gənclər arasında üzgüçülük çempionatları; **3**. kiçik *(vəzifəcə, mövqecə)*; **~ partner** kiçik partnyor

**junior high school** ['dʒu:njə'haısku:l] *n amer.* natamam orta məktəb

**junior school** ['dʒu:njə'sku:l] *n İngiltərədə uşaqların 7-11 yaş arasında oxuduqları məktəb*

**junta** ['dʒʌntə] *n* xunta *(İspaniyada və Latın Amerikası ölkələrində ictimai-siyasi təşkilat və birləşmələrin adı)*

**Jupiter** ['dʒu:pıtə(r)] *n astr.* Yupiter *(Günəş sistemində ən böyük planetin adı)*

**juridical** [dʒuə'rıdıkl] *adj* hüquq, hüquqi; qanuni, qanunauyğun; **~ person** hüquqi şəxs

**juridically** [dʒuə'rıdıkəlı] *adv* **1**. hüquqi baxımdan/ nöqteyi-nəzərdən/cəhətdən; **2**. məhkəmə yolu ilə/vasitəsilə

**jurisdiction** [͵dʒuərıs'dıkʃn] *n* **1**. məhkəmə üsulu; ədalət məhkəməsinə göndərmə; **2**. yurisdiksiya *(məhkəmə hüququ)*; məhkəməlik, məhkəməyə aid olma, məcburi; **exclusive ~** tam/şübhəsiz məhkəməlik; **compulsory ~** məcburi məhkəməlik; **military ~** hərbi yurisdiksiya; **~ of court martial** hərbi məhkəmənin yurisdiksiyası

**jurisprudence** ['dʒuərıs͵pru:dns] *n* hüquqşünaslıq, hüquq elmləri; **a professor of ~** hüquqşünaslıq üzrə professor

**jurist** ['dʒuərıst] *n* **1**. hüquqşünas; **2**. *amer.* vəkil; **3**. hüquq fakültəsinin tələbəsi

**juror** ['dʒuərə(r)] *n* **1**. prisyajnı iclasçı *(əhalinin imtiyazlı təbəqələri tərəfindən seçilmiş məhkəmə iclasçısı)*; **2**. jürinin üzvü; **grand/petty ~** böyük/kiçik jürinin üzvü; **3**. and içən

**jury** ['dʒuərı] *n* **1**. *hüq.* prisyajnı iclasçılar, prisyajnılar məhkəməsi, prisyajnıların tərkibi; **2**. *id.* jüri; hakimlər kollegiyası; **~ of appeal** baş hakimlər kollegiyası; *The jury is/are about to announce the winners Jüri qalibləri elan etməyə hazırlaşır*

**just**[1] [dʒʌst] *adj* **1**. insaflı, ədalətli, adil; haqlı; **a ~ and honourable ruler** ədalətli/ adil və şərəfli hökmdar; **a ~ decision** ədalətli/haqlı qərar; **a ~ law** ədalətli qanun; **a ~ society** ədalətli cəmiyyət; **to be ~ to/ towards** ***smb.*** bir kəsə qarşı ədalətli olmaq; *The just demands of the workers must be met Fəhlələrin haqlı tələbləri yerinə yetirilməlidir*; **2**. layiq, ləyaqətli; **~ reward/punishment** layiqli mükafat/cəza; **3**. əsaslı, əsaslandırılmış, inandırıcı; **~ opinion** ağıllı/əsaslı fikir; **~ suspicion** əsaslı şübhə; **~ fear** əsası olan qorxu; **4**. düz, dəqiq; **~ scales/balances** dəqiq/düz tərəzi

**just**[2] [dʒʌst] *adv* **1**. həmin, düz, lap dəqiq; **~ the**

**man** həmin adam; ~ **the thing** düz lazım olan şey; *It's just two o'clock Düz saat ikidir; This jacket is just my size Bu pencək düz/lap mənim ölçümdədir; Put it just here/there Onu düz bura/ora qoy/qoyun; He's just in time O düz/lap vaxtında gəlib; She looks just like her mother O lap anasına oxşayır; It's just what I wanted Bu lap mən istədiyimdir*; 2. güclə, zorla, ancaq-ancaq, güc-bəla ilə; *I just caught the train Mən qatara güclə/zorla çatdım; Only just enough Güclə/Zorla çatır*; 3. indicə, bu saat, təzəcə, yenicə; *She has just come O indicə/yenicə gəlib; The book is just out Kitab yenicə/təzəcə/bu saat çıxıb (çapdan)*; ~ **now** indicə, bu saat; *He was here just now O indicə/bu saat burada idi*; 4. sadəcə olaraq; tamamilə; *Time just flew Vaxt sadəcə olaraq uçurdu*; ~ **like**, ~ **the same** tamamilə oxşar/eyni; 5. bircə; *Just look Bircə bax/baxın; Just listen Bircə qulaq as/asın*

◊ ~ **about** təxminən, təqribən; demək olar ki; *He's just about thirty O təxminən/təqribən otuz yaşındadır*; ~ **in case** hər bir ehtimala qarşı; *I'll leave a note just in case Hər bir ehtimala qarşı mən məktub qoyacam; Just my luck Mənim bəxtim belədir, Mənimki belə gətirir*; ~ **out of a handbox** tamamilə təzə/təptəzə; ~ **the same** dəxli yoxdur, eynidir; *It's just the same to me Mənim üçün dəxli yoxdur/ eynidir*

**justice** ['dʒʌstɪs] *n* 1. ədalət, insaf; **to treat** *smb.* **with** ~ bir kəsə ədalətlə/insafla yanaşmaq; **to do** ~ **to someone, to do someone** ~ bir kəsə qarşı ədalətlə davranmaq; **to cry for** ~ ədalət istəmək; ədalətə/haqqa çağırmaq; 2. qanunilik; ədalət məhkəməsi; ədliyyə; **to bring to** ~ məhkəməyə cəlb etmək/çəkmək; **to deliver** *smb.* **up to** ~ bir kəsi məhkəmənin əlinə vermək; 3. hakim; **Justice of the Peace** barışdırıcı hakim;

◊ **poetical** ~ ideal ədalət; **to do** ~ **to** *smb.*/**to** *smth.* bir kəsə/bir şeyə ədalətlə qiymət vermək; **to do oneself** ~ özünü ən yaxşı cəhətdən göstərmək

**justifiable** ['dʒʌstɪfaɪəbl] *adj* haqq qazandırıla bilən, haqlı; qanuni; yol/icazə verilə bilən, mümkün olan; ~ **homicide** *hüq.* özünümüdafiə məqamında törədilən qətl; ~ **claims** qanuni tələblər; ~ **behaviour** yol verilə bilən davranış/hərəkət/rəftar

**justifiably** ['dʒʌstɪfaɪəblɪ] *adv* haqlı, yerli; qanunən, qanunla, qanuna uyğun olaraq; yol veriləcək tərzdə

**justification** [ˌdʒʌstɪfɪ'keɪʃn] *n* 1. təmizə çıxartma, bəraət qazandırma, bəraət; *There is no justification for his rude behaviour Onun belə kobud/qaba hərəkətinə heç cür bəraət qazandırmaq olmaz*; 2. qanunauyğunluq, qanunilik

**justificative** ['dʒʌstɪfɪkeɪtɪv] *adj* bəraət, bəraətverici; təsdiqləyici, təsdiqedici, sübutedici; günahsız olduğunu sübut edən

**justified** ['dʒʌstɪfaɪd] *adj* 1. haqlı, yerli; *She felt fully/entirely justified in asking for her money back O, pulunun geri qaytarılmasını istəməkdə tamamilə haqlı olduğunu hiss etdi*; 2. əsaslı, əsası olan; *Her fears proved justified Onun qorxularının əsası olduğu sübuta yetdi*

**justify** ['dʒʌstɪfaɪ] *v (pt, pp* **-fied**) 1. bəraət /haqq qazandırmaq, təmizə çıxartmaq; **to** ~ ***one's*** **behaviour** hərəkətinə/davranışına haqq qazandırmaq; *Tiredness cannot possibly justify such behaviour Yorğunluq, yəqin ki, belə davranışa haqq qazandıra bilməz*; 2. təsdiq etmək, doğru olduğunu sübuta yetirmək/sübut etmək; doğrultmaq *(ümidi və s.)*; **to** ~ ***one's*** **hopes** ümidlərini doğrultmaq

**justly** ['dʒʌstlɪ] *adv* 1. insafla, ədalətlə; düzgün, qanuna uyğun/müvafiq olaraq, qanunla; **to act** ~ insafla/ədalətlə/qanuna uyğun olaraq hərəkət etmək; 2. haqlı/düzgün olaraq; **to be** ~ **punished/rewarded** haqlı olaraq cəzalandırılmaq /mükafatlandırılmaq

**justness** ['dʒʌstnɪs] *n* 1. ədalət, haqq, insaf; 2. dəqiqlik, düzgünlük, dürüstlük, doğruluq

**jut** [dʒʌt] *v* (**-tt-**) çıxmaq, irəli/qabağa çıxmaq *(adət.* **to** ~ **out/forth**)

**juvenescence** [ˌdʒuːvɪ'nesns] *n* 1. gənclik, cavanlıq; 2. cavanlaşma, gəncləşmə

**juvenescent** [ˌdʒuːvɪ'nesnt] *adj* cavanlaşan, gəncləşən

**juvenile[1]** ['dʒuːvɪnaɪl] *n* cavan/gənc oğlan; yeniyetmə *(12-17 yaşlar arasında oğlan və qız)*

**juvenile[2]** ['dʒuːvɪnaɪl] *adj* gənc, cavan; gənclik, cavanlıq; ~ **years** gənclik/cavanlıq illəri; ~ **delinquency** yeniyetmələr arasında cinayət; ~ **ardour** gənclik/cavanlıq coşğunluğu/alovu; ~ **follies** gənclik /cavanlıq səhvləri; ~ **book** 1) gənclər üçün kitab; 2) *amer.* uşaq kitabı; ~ **literature** 1) gənclər üçün ədəbiyyat; 2) uşaq ədəbiyyatı; ~ **library** gənclər üçün kitabxana

**juvenility** [ˌdʒuːvɪ'nɪlɪtɪ] *n* 1. gənclik, cavanlıq; 2. *top. i* gənclər, cavanlar

**juxtapose** ['dʒʌkstəpouz] *v* 1. yan-yana/yan-yanaşı/yanbayan qoymaq; 2. tutuşdurmaq, müqayisə etmək, qarşılaşdırmaq; **to** ~ **light and shade** işıqla kölgəni müqayisə etmək

**juxtaposition** [ˌdʒʌkstəpə'zɪʃn] *n* 1. bitişiklik, qonşuluq; təmas; 2. qarşılaşdırma, müqayisə etmə, tutuşdurma



# Kk

**K, k** [keɪ] *n (pl* **K's, k's** [keɪz] *ingilis əlifbasının 11-ci hərfi*

**kale** [keɪl] *n bot.* yem kələmi

**kaleidoscope** [kə'laɪdəskoup] *n* 1. kaleydoskop *(əldə fırlatdıqda rəngbərəng naxışlar göstərən boruşəkilli optik oyuncaq)*; 2. hadisələrin və təəssüratların tez-tez dəyişməsi

**kaleidoscopic** [kəˌlaɪdə'skɔpɪk] *adj* = **kaleidoscopical**

**kaleidoscopical** [kəˌlaɪdə'skɔpɪkəl] *adj* 1. kaleydoskop; 2. *məc.* tez-tez dəyişən, kaleydoskopaoxşar, kaleydoskopabənzər

**kamikaze** [ˌkæmɪ'kaːzɪ] *adj* kamikaze

**kangaroo** [ˌkæŋgə'ruː] *n (pl* **-oos**) *zool.* kenquru *(Avstraliyada yaşayan kisəli heyvan)*

**kaput** [kə'put] *adj* məhv olmuş; işi bitmiş; *My bike is kaput Mənim velosipedim xarab olub*

**kazakh[1]** [kə'zaːh] *n* qazax; **the ~s** *top.i* qazaxlar

**kazakh[2]** [kə'zaːh] *adj* qazax; **the** ~ **language** qazax dili

**kebab** [kɪ'bæb] *n (çox vaxt pl)* kabab; **lamb ~s** quzu kababı

**keen[1]** [kiːn] *adj* (**-er, -est**) 1. iti; ~ **knife/ sword** iti bıçaq/qılınc; 2. kəskin, tünd *(dad haq.)*; **dishes with a** ~ **relish** tünd xuruşu olan xörəklər; 3. kəskin, çox bərk/ güclü, şiddətli; ~ **wind** şiddətli/çox güclü külək; ~ **cold** kəskin/şiddətli soyuq; ~ **frost** çox bərk/şiddətli şaxta; ~ **pain** kəskin/şiddətli ağrı; ~ **appetite** kəskin/iti iştaha; 4. dərin; ~ **sorrow** dərin kədər; 5. gərgin; ~ **fight** gərgin döyüş; 6. tikanlı, kəskin; ~ **criticism** tikanlı/kəskin tənqid; 7. həvəsli, coşğun; ~ **sportsman** coşğun/ həvəsli idmançı; **to be** ~ **on** *smth.* bir şeyi çox sevmək/istəmək; **to be** ~ **on/upon/ about sport/music/horses** idmanı/musiqini/atları çox sevmək; 8. bir şeyə can atan, bərk həsrətində/arzusunda olan; ~ **for money** bərk pul arzusunda olan; ~ **on pleasure** əyləncəyə can atan

**keen[2]** [kiːn] *v* ölən üçün ağı demək; fəryad /fəğan etmək, şivən qoparmaq, hönkürə-hönkürə ağlamaq, oxşayıb ağlamaq; *The women were keening Qadınlar hönkürə-hönkürə ağlayırdılar, Qadınlar oxşayıb ağlayırdılar/şivən qoparırdılar*

**keep[1]** [kiːp] *n d.d.* 1. qədim qalada böyük möhkəm qüllə; 2. yemək, yemək-içmək, qida; geyim; dolanacaq; *It's time you got a job to earn your keep Sənin/Sizin bir işlə məşğul olub öz dolanacağını/dolanacağınızı qazanmaq vaxtındır/vaxtınızdır*

**keep[2]** [kiːp] *v (pt, pp* **kept** [kept]) 1. tutmaq; **to** ~ ***smth.*** **in** ***one's*** **hands** bir şeyi əlində tutmaq; 2. saxlamaq; **to** ~ **money in the savings-bank** pulu əmanət bankında saxlamaq; **to** ~ ***one's*** **letters under lock and key** məktublarını qıfıl altında/qıfıllı yerdə saxlamaq; **to** ~ **old clothes/ books/things** köhnə paltarları/kitabları/şeyləri saxlamaq; *I can make money, but I cannot keep it Mən pul qazana bilirəm, lakin onu saxlaya bilmirəm*; **to** ~ **poultry/bees/dogs** toyuq-cücə/arı/it saxlamaq; 3. olmaq, sahib olmaq; **to** ~ **a car/a shop/a bar** maşını/dükanı/barı olmaq; 4. baxmaq, təmin etmək; **to** ~ **an old mother/children/a family** qoca anaya/uşaqlara/ailəyə baxmaq; **to** ~ ***smb.*** **in clothes/in food** bir kəsi paltarla/geyimlə təmin etmək; 5. satışda olmaq; **to** ~ **eggs/butter** satışda yumurta/ yağ olmaq; yumurta/yağ alveri etmək/satmaq; 6. saxlamaq; buraxmamaq; **to** ~ **a stock of** ***smth.*** bir şeydən ehtiyat saxlamaq; **to** ~ ***smb.*** **for two hours** bir kəsi iki saat saxlamaq/buraxmamaq; *I was kept at the police station Məni polis məntəqəsində/bölməsində saxladılar*; **to** ~ ***smb.*** **at home** bir kəsi evdə saxlamaq/evdən buraxmamaq; **to** ~ **a mistress** aşna saxlamaq; 7. qorumaq, mühafizə/hifz etmək; **to** ~ **a bridge/a road/a fortress** körpünü/yolu/ qalanı mühafizə etmək/qorumaq; **to** ~ **goal** qapını müdafiə etmək *(futbol oyununda); God keep you! Allah səni/sizi hifz etsin!*; 8. getmək, hərəkət etmək; **to** ~ **to the main road** şosse yolla getmək; **to** ~ **the middle of the road** yolun ortası ilə getmək/hərəkət etmək; **to** ~ ***one's*** **way** öz yolu ilə getmək; **to** ~ **on the right track** düzgün/doğru yolla getmək; *Keep straight on Düz get/gedin*; **to** ~ **along the river** çay boyunca getmək; 9. (**to**) kənara çıxmamaq, yayınmamaq, əməl etmək; **to** ~ **to the subject** mövzudan/mətləbdən kənara çıxmamaq/yayınmamaq; **to** ~ **a promise** vədi yerinə yetirmək, vədə əməl etmək; **to** ~ **to the pledge** öhdəliyi yerinə yetirmək; **to** ~ ***one's*** **word/promise/ oath** sözünü/vədini/andını yerinə yetirmək; 10. açmamaq, saxlamaq; **to** ~ **a secret** sirr saxlamaq, sirri açmamaq; 11. tutmaq *(gündəlik)*; **to** ~ **a diary** gündəlik tutmaq; 12. qaydada saxlamaq, müntəzəm olaraq yığışdırmaq *(evi, mənzili və s.)*; **to** ~ **the house** evi qaydasında saxlamaq; 13. yadda saxlamaq; **to** ~ ***smth.*** **in memory** bir şeyi yadında/yaddaşda saxlamaq; **to** ~ ***smb.*** **doing** ***smth.*** bir kəsi bir şeyi etməyə məcbur/vadar etmək; **to** ~ ***smb.*** **working** bir kəsi işi davam etməyə vadar etmək; *He kept us standing two hours O bizi iki saat ayaq üstə dayanmağa vadar etdi; People don't like to be kept waiting Adamlar onları gözləməyə vadar etməyi xoşlamırlar*; **to** ~ **out of** ***smth.*** bir şeyə qarışmamaq;

**to ~ out of *smb.'s* quarrel** bir kəsin mübahisəsinə qarışmamaq; **to ~ *smb.* out of *smth.*** bir kəsi bir şeydən kənarda saxlamaq; **to ~ *smb.* out of the room** bir kəsi otağa buraxmamaq; **to ~ *smb.* awake** bir kəsi yatmağa qoymamaq/ oyaq saxlamaq; **to ~ oneself clean/tidy** özünü təmiz/səliqəli saxlamaq; **to ~ *smb.* (a) prisoner** bir kəsi həbsxanada saxlamaq; **to ~ away** kənar durmaq/gəzmək, qarışmamaq; *Keep away from the fire! Oddan kənar dur!/durun!; Keep back! Geri dur!/durun!*; **to ~ on 1)** davam etmək; *School keeps on till four o'clock Məktəbdə dərslər saat dördə qədər davam edir;* 2) çıxartmamaq *(paltarı və s.)*; **to ~ on *one's* hat** papağını çıxartmamaq;

◊ **to ~ house** ev təsərrüfatı/işləri ilə məşğul olmaq; **to ~ open house** qonaqpərvərlikdə ad qazanmaq; **to ~ step with *smb.*** bir kəslə ayaqlaşmaq; **to ~ *one's* head cool** başını itirməmək, təmkinli olmaq; **to ~ *one's* mouth shut** dilini sakit saxlamaq, danışmamaq, susmaq; **to ~ in with the law** qanuna tabe olmaq, qanunu pozmamaq, qanuna riayət etmək

**keeper** [ˈkiːpəʳ] *n* 1. saxlayan, qoruyan, mühafizə edən; mühafiz *(muzeylərdə, kitabxanalarda və s. vəzifə adı)*; **~ of manuscripts/rare books** əlyazmalarını/nadir kitabları saxlayan; 2. gözətçi, nəzarətçi *(həbsxanada, meşədə)*; 3. sahib, xüsusiyyətçi, yiyə; sahibkar; **coffee-house ~** kafe sahibi; **poultry ~** quşçu, quşsaxlayan, quşçuluq mütəxəssisi; 4. uzun müddət saxlanıla bilən ərzaq; **an apple that is a good ~** uzun müddət saxlanıla bilən alma

**keeping** [ˈkiːpɪŋ] *n* 1. saxlama, saxlanma; mühafizə etmə/edilmə; qoruma, olduğu kimi qalma; saxlanc; **in safe ~** tam qorunma; etibarlı əldə; **to have *smth.* in *one's* ~ 1)** bir şeyi saxlanca qoymaq; **to be in *smb.'s* ~** bir kəsin saxlancında olmaq; 2) bir kəsin qəyyumluğunda olmaq; **to have *smb.* in *one's* ~** bir kəsə qəyyumluq etmək, bir kəsi qəyyumluğa götürmək; 2. razılıq, uyğunluq; müvafiqlik; **in ~ with *one's* principles** öz prinsiplərinə uyğun; **in ~ with *one's* income** gəlirinə uyğun/muvafiq; *His acts are out of keeping with his words Onun hərəkətləri sözlərinə uyğun/müvafiq gəlmir;* 3. əməl/riayət etmə; **~ of *one's* promise** vədinə əməl etmə

**keepsake** [ˈkiːpseɪk] *n* yadigar, xatirə olaraq verilmiş hədiyyə/bir şey; *My aunt gave me one of her rings as a keepsake Xalam üzüklərindən birini yadigar olaraq mənə verdi*

**keg** [keg] *n* balaca çəlləkçə *(xüs. pivə üçün)*

**kennel¹** [ˈkenl] *n* 1. it damı; 2. *məc.* daxma

**kennel²** [ˈkenl] *v* 1. dama salmaq *(iti)*, damda saxlamaq *(iti)*; 2. *məc.* sürünmək, mənasız/ məqsədsiz həyat sürmək/yaşamaq

**kept** [kept] **to keep** *felinin* **pt, pp** *formaları*

**kerb¹** [kəːb] *n* kənar, qıraq *(yolun, meşənin və s.)*; bordyur *(yolda)*

**kerb²** [kəːb] *v* daş bordyur tikmək

**kerchief** [ˈkəːtʃɪf] *n* 1. baş yaylığı, örpək, ləçək; şərf; 2. əl yaylığı

**kernel** [ˈkəːnl] *n* 1. ləpə, iç *(qozda, fındıqda və s.)*; **~ of a nut/almond** qozun/badamın ləpəsi; 2. çəyirdək, tum; **~ of a peach/cherry, *etc.*** şaftalının/albalının *və s.* çəyirdəyi/tumu; 3. məğz, mahiyyət, əsas mətləb; **the ~ of a narrative** hekayənin məğzi/mahiyyəti; **the true ~ of the matter/question** məsələnin mahiyyəti/ məğzi; 4. *fiz.* nüvə *(atomda)*

**kerosene** [ˈkerəsiːn] *n* neft, ağ neft, lampa nefti

**ketchup** [ˈketʃəp] *n* ketçup *(tünd tomat sousu)*

**kettle** [ˈketl] *n* çaydan; **an electric ~** elektrik çaydanı; **to put the ~ on the stove** çaydanı sobanın/peçin üstünə qoymaq; **to switch the ~ on** çaydanı cərəyana taxmaq; *The kettle is boiling Çaydan qaynayır*

**kettle-drum** [ˈketldrʌm] *n* nağara

**key¹** [kiː] *n* 1. açar; **safe ~** seyf açarı; **~ of the door** qapının açarı; **the car ~s** maşın açarları; **to turn the ~ in the lock** açarı qıfılda çevirmək; 2. *mus.* dil; **piano ~s** piano dilləri

**key²** [kiː] *adj* əsas, aparıcı; **~ industries** əsas sənaye sahələri; **~ position** əsas/hakim mövqe; **~ word** əsas söz; **~ actor** *amer.* aparıcı aktyor;

◊ **golden/silver ~** rüşvət; **to deliver *one's* ~s** təslim olmaq, məğlub olmasını etiraf etmək; **to hold the ~ of *smth.*** bir şeyi tam nəzarət altında saxlamaq

**key³** [kiː] *v* I açarla bağlamaq

**key** [kiː] *v* II musiqi alətlərini kökləmək

**keyhole** [ˈkiːhoul] *n* açar yeri/deşiyi

**keynote** [kiːnout] *n* 1. *mus.* tonika *(qammanın birinci tonu)*; 2. leytmotiv, əsas fikir/məqsəd, ana xətt; **the ~ of the speech /report** nitqin/məruzənin leytmotivi

**keystone** [ˈkiːstoun] *n* 1. *mem.* qovuşaq daşı *(tağda)*; 2. təməl/guşə daşı, əsas, bünövrə; əsas prinsip

**khaki** [ˈkaːkɪ] *n* 1. xaki, xaki rəng, xaki rəngli parça; 2. hərbi forma/paltar

**khanate** [ˈkaːneɪt] *n* xanlıq, xanlıq hakimiyyəti

**kick¹** [kɪk] *n* 1. zərbə, vurma, itələmə; təpik; təpik vurma/atma; **~s and punches** təpiklər və dümsüklər; **a ~ of a horse** at təpiyi; **to give *smb.* a ~ on the shin/in the stomach** bir kəsin baldırına/qarnına təpik vurmaq; **to give a ~** itələmək; *If the door won't open, give it a kick Əgər qapı açılmasa, onu itələ/itələyin;* 2. *id.* topa zərbə vurma/endirmə; **corner ~** künc zərbəsi; **free ~** sərbəst zərbə; **direct free ~** cərimə zərbəsi; **penalty ~** on bir metrlik zərbə; **~ at the goal** qapıya zərbə; 3. *d.d.* futbolçu; **a good ~** yaxşı futbolçu; 4. *d.d.* həzz, zövq, ləzzət, kef, səfa; **to get a big ~ out of *smth.*/out of doing *smth.*** bir şeydən /bir şeyi etməkdən çox ləzzət/zövq/həzz almaq; 5. təpmə *(silah haq.)*



**kick²** [kɪk] *v* 1. təpik/dümsük vurmaq; **to ~ *smb.*** bir kəsə təpik/dümsük vurmaq; **to ~ a dog** itə təpik vurmaq; 2. *id.* vurmaq, zərbə endirmək *(topa və s.)*; **to ~ the ball** topa zərbə vurmaq; **to ~ the ball into play** topu oyuna daxil etmək *(qapıçı tərəfindən)*; 3. şıllaqlamaq, şıllaq atmaq, təpikləşmək, şıllaqlaşmaq; *The children were screaming and kicking Uşaqlar qışqırır və təpikləşirdilər;* 4. sağrısı ilə vurmaq, şıllaq/təpik atmaq *(at haq.)*; *This horse kicks Bu at şıllaq/təpik atır;* 5. təpmək; *The modern gun hardly kicks at all Müasir silahlar demək olar ki, qəti təpmir;* 6. *d.d.* qalmaqal/dava/qovğa/cəncəl/şuluqluq salmaq; 7. *amer.* ciddi surətdə/qəti etiraz etmək; üsyan/qiyam qaldırmaq; **to ~ against/ at cruel treatment/ taxes/high prices/decisions** kobud rəftara/vergilərə/yüksək qiymətlərə/qərarlara qarşı qəti etiraz etmək; **to ~ about** üstündən atmaq/ tullamaq; **to ~ a ball about** topu üstündən atmaq; **to ~ aside** kənara atmaq/tullamaq; **to ~ away** təpiklə qovlamaq, qovalamaq; **to ~ back** zərbəyə zərbə ilə cavab vermək; **to ~ in** itələyib soxmaq; **to ~ off** ayağı ilə tullamaq, qımçırlamaq; **to ~ off *one's* shoes** ayaqqabılarını qımçırlamaq *(ayağı ilə)*; **to ~ out 1)** dümsüklə/təpiklə qovmaq; 2) biabırçılıqla qovmaq;

◊ **to ~ a man when he is down** yıxılanı vurmaq/döymək; **to ~ the goal** hədəfə düşmək; **to ~ the bucket** ölmək; **to ~ up a dust/a row** qalmaqal salmaq, səs-küy/ toz qaldırmaq

**kid¹** [kɪd] *n* I 1. uşaq; *How are your wife and kids? Arvadın və uşaqların/Arvadınız və uşaqlarınız necədir?;* 2. cavan, gənc; *Half the kids round here are unemployed Bu ətrafda cavanların yarısı işsizdir;* 3. oğlaq, keçi balası; çəpiş; 4. çəpiş əti; 5. layka *(yumşaq dəri növü)*

**kid** [kɪd] *n* II aldatma; hiylə, kələk, yalan, fırıldaq; *It was all a kid Bu başdan-başa yalan/kələk/hiylə/fırıldaq idi*

**kid²** [kɪd] *adj amer.* balaca, kiçik; **his ~ sister /brother** onun balaca bacısı/qardaşı

**kid³** [kɪd] *v* (-dd-) I aldatmaq, kələk/hiylə gəlmək, sataşmaq; **to ~ *smb.*** bir kəsi aldatmaq, bir kəsə kələk/fırıldaq gəlmək; *He kidded his mother that he was ill O, anasını aldatdı ki, o, xəstədir;* **to ~ *smb.* into *smth.*/into doing *smth.*** bir kəsi aldadaraq bir işi görməyə vadar etmək; *I thought he was kidding at first Əvvəlcə mən fikirləşdim ki, o, məni aldadır/mənə fırıldaq gəlir;* **to ~ around** bir kəsi ələ salmaq; *Don't kid around with me Məni aldatmağa/Mənə fırıldaq gəlməyə çalışma/çalışmayın*

**kid** [kɪd] *v* (-dd-) II balalamaq *(keçi haq.)*

**kidnap¹** [ˈkɪdnæp] *n* = **kidnapping**

**kidnap²** [ˈkɪdnæp] *v* (-pp-) oğurlamaq *(uşaq, adam)*; *Two businessmen have been kidnapped by terrorists İki iş adamı terroristlər tərəfindən oğurlanıb, Terroristlər iki iş adamını oğurlayıblar*

**kidnapping** [ˈkɪdnæpɪŋ] *n* adam oğurlama; *Kidnapping is a crime Adam oğurlama cinayətdir*

**kidney** [ˈkɪdnɪ] *n* (*pl* -eys) 1. *anat.* böyrək; 2. *aşp.* böyrək *(xörək)*; **grilled ~s** qovrulmuş böyrək; 3. xarakterik xüsusiyyət; temperament, məcaz, təbiət; **a man of that ~** bu təbiətli adam; *I wouldn't trust anyone of that kidney Mən belə təbiətli /xarakterli adama inanmazdım*

**kidney bean** [ˈkɪdnɪˈbiːn] *n bot.* paxla, lobya, maş

**kidney stone** [ˈkɪdnɪstoun] *n* 1. çınqıl; xırda çay daşı; 2. *tib.* böyrək daşı

**kill¹** [kɪl] *n* 1. qənimət *(ovda)*; **plentiful ~** yaxşı ov, bol qənimət *(ovda)*; 2. topu saxlama *(futbol oyununda)*

**kill²** [kɪl] *v* 1. öldürmək; **to ~ a man/a fox /an animal** adam/tülkü/heyvan öldürmək; **to ~ *smb.'s* feelings** bir kəsin hisslərini öldürmək; **to be ~ed in battle/in a motor accident** döyüşdə/avtomobil qəzasında ölmək; 2. şaxta vurmaq; *The frost killed the flowers Şaxta çiçəkləri vurdu;* 3. üzmək, əldən salmaq; *Grief is killing her Kədər onu üzür; The disease/drink slowly killed him Xəstəlik/İçki onu yavaş-yavaş əldən saldı;* 4. məhv /yox etmək, aradan qaldırmaq *(həm də* **to ~ off***)*; **to ~ a disease** xəstəliyi yox etmək/aradan qaldırmaq; 5. rədd etmək; **to ~ a bill/a proposal** layihəni/təklifi rədd etmək; 6. söndürmək; **to ~ the engine** mühərriki söndürmək;

◊ **to ~ the ball** *id.* topu kəsmək; **to ~ time** vaxt öldürmək; **to ~ the bottle** *amer.* sərxoş olana kimi içmək, butulkanı boşaltmaq

**killer¹** [ˈkɪləʳ] *n* 1. qatil, killer; 2. *amer.* bandit, quldur

**killing¹** [ˈkɪlɪŋ] *n* 1. öldürmə, öldürülmə; 2. kəsmə *(heyvanı)*

**killing²** [ˈkɪlɪŋ] *adj* öldürücü, ölümcül, məhvedici; **~ frost** öldürücü/məhvedici şaxta

**kilo** [ˈkiːlou] *n* kilo, kiloqram

**kilogram** *(və ya* **kilogramme***)* [ˈkɪləgræm] *n (qısa forması:* **kg***)* kiloqram

**kilometre** [ˈkɪlə.miːtəʳ] *n (qısa forması:* **km***)* kilometr

**kilowatt** [ˈkɪləwɔt] *n fiz.* kilovatt *(1000 vatta bərabər elektrik cərəyan gücü vahidi)*

**kin** [kɪn] *n* 1. *top.* i qohum-qardaş, qohum-əqrəba, qohumlar; qohum; ailə; **blood ~** qan qohumu/qohumları; 2. qan qohumluğu; **to be ~** qan qohumu olmaq; *We are kin Biz qan qohumuyuq; He's kin to me O mənim qan qohumumdur;* **near of ~** yaxın qohumu/qohumları

**kind¹** [kaɪnd] *n* növ, çeşid, sort; **good/bad/ usual ~** yaxşı/pis/adi növ; **a new ~ of silk/ paper /apples** yeni növ ipək/kağız/alma; **different ~s of animals/plants/fruits** müxtəlif növ heyvanlar/bitkilər/meyvələr; **things of this ~** bu növ şeylər; *What kind of plant/ paper/book is this? Bu hansı növ bitkidir/kağızdır/kitabdır?; What kind of man is he? O nə cür/necə adamdır?* **the ~s of**

sentences cümlənin növləri; *They differ in size but not in kind Onlar növcə deyil, ölçücə fərqlənir;*

◊ **in ~** natura *(pul əvəzində verilən mal, məhsul)*; **to pay in ~** natura ilə ödəmək; *The farmer sometimes used to pay me in kind Fermer bəzən mənə borcunu natura ilə ödəyərdi*

**kind²** [kaınd] *adj (-er, -est)* 1. xoşxasiyyət, mərhəmətli, ürəyiyumşaq; xeyirxah; mehriban; nəvazişli, nəvazişkar; **~ person** mərhəmətli/ mehriban/xoşxasiyyət adam; **to be ~ to** *smb.* bir kəsə qarşı mehriban/ xeyirxah/mərhəmətli olmaq; 2. lütfkar, iltifatlı, gülərüzlü; *You are very kind Siz çox lütfkarsınız/iltifatlısınız; Would you be kind enough to help me? Lütfən mənə kömək edərdinizmi?*

**kindergarten** ['kındə͵gɑ:tn] *n* uşaq bağçası

**kind-hearted** ['kaınd'hɑ:tıd] *adj* ürəyiyumşaq, rəhmli, rəhmdil, mərhəmətli; xeyirxah; **a ~ man** ürəyiyumşaq/mərhəmətli/ xeyirxah adam

**kind-heartedness** ['kaınd'hɑ:tıdnıs] *n* xoşxasiyyətlilik, mehribanlıq, mərhəmətlilik, rəhmdillik, ürəyiyumşaqlıq

**kindle** ['kındl] *v* 1. yandırmaq, qalamaq; alışmaq, yanmaq; **to ~ a fire** tonqal/ocaq qalamaq; *The spark kindled the dry grass Qığılcım quru otu yandırdı*; 2. alovlandırmaq; oyatmaq, oyandırmaq; doğurmaq; **to ~ interest** maraq doğurmaq/oyatmaq; **to ~ anger** qəzəb oyatmaq/doğurmaq; **to ~ passions** ehtirasları qızışdırmaq /oyatmaq

**kindling** ['kındlıŋ] *n* 1. yanma, yandırma, alışma, alışdırma; 2. alovlanma, alovlandırma; 3. *məc.* qızışdırma, doğurma, oyatma *(maraq, ehtiras və s.)*

**kindly¹** ['kaındlı] *adj* 1. xoşxasiyyət, rəhmli, mərhəmətli, səmimi, dostcasına, mehriban; yumşaq, həlim; həssas; **~ smile** səmimi/mehriban/dostcasına təbəssüm; **~ old man** xoşxasiyyət/ rəhmli/ mərhəmətli qoca kişi; **~ advice** səmimi/dostcasına məsləhət; 2. mülayim; **~ climate** mülayim iqlim/ab-hava

**kindly²** ['kaındlı] *adv* xeyirxahlıqla, xeyir-xahcasına; gülərüzlə, iltifatla, mehribanlıqla, lütfkarlıqla, dostcasına; səmimiyyətlə; **to speak ~** dostcasına/səmimiyyətlə danışmaq; **to write ~** dostcasına/səmimiyyətlə yazmaq; **to answer ~** mehribanlıqla/iltifatla/səmimiyyətlə cavab vermək

**kindness** ['kaındnıs] *n* 1. mehribanlıq, rəhmlilik, mərhəmət, səmimilik, istiqanlılıq, xeyirxahlıq; **~ of heart** səmimilik, mehribanlıq, ürəyin yumşaqlığı; 2. iltifat, gülərüzlülük, lütfkarlıq, yaxşılıq; 3. xidmət, kömək; **personal ~** şəxsi xidmət; **to show/to do** *smb.* **~** bir kəsə xidmət göstərmək /etmək; *I received many kindness from him O mənə çox xidmət göstərib/yaxşılıq edib*

**kindred¹** ['kındrıd] *n* 1. *top. i* qohumlar, qohum-əqrəba, qohum-qardaş; **to claim ~** qohumluğa iddia etmək; 2. yaxınlıq, mənəvi yaxınlıq; 3. *arx.* qəbilə, nəsil, soy; ailə, tayfa; *Most of his kindred still live in Ireland Onun nəslinin əksəriyyəti hələ də İrlandiyada yaşayır*

**kindred²** ['kındrıd] *adj* 1. qohum; **~ tribes/ families** qohum qəbilələr/ailələr; **~ languages** qohum dillər; 2. oxşar; eyni; **~ phenomena** oxşar/eyni hadisələr; **~ diseases** oxşar xəstəliklər

**kinetic** [kı'netık] *adj* kinetik *(hərəkətə aid olan)*; **~ energy** kinetik enerji, hərəkət enerjisi

**kinetics** [kı'netıks, kaı-] *n* kinetika *(dinamikanın cisimləri hərəkətə gətirən yaxud onların hərəkətini dəyişdirən qüvvələrdən bəhs edən elm şöbəsi)*

**king¹** [kıŋ] *n* 1. kral, padşah, hökmdar; **the King of England** İngiltərənin Kralı; **lawful/uncrowned ~** qanuni/qeyri-qanuni kral; **King of Kings** Krallar Kralı; **to crown ~** kralın başına tac qoymaq; **to proclaim ~** kral elan etmək; 2.: **~ of beasts** heyvanların kralı *(aslan, şir)*; **~ of birds** quşların kralı *(qartal)*; 3. maqnat *(iri kapitalist)*; **oil ~** neft maqnatı; **railway ~** dəmir yol maqnatı; 4. *şahm.* şah; **to check to the King** şah demək/elan etmək; **to checkmate the King** şahı mat etmək; 5. damka *(dama oyununda istənilən tərəfə yeridilə bilən daş)*

**king²** [kıŋ] *v* 1. idarə/başçılıq etmək; 2. *məc.* özünü kral kimi aparmaq, özünü krala oxşatmaq; 3. ağalıq/hökmranlıq etmək

**kingdom** ['kıŋdəm] *n* 1. krallıq, şahlıq, səltənət; dövlət; **the United Kingdom** Birləşmiş Krallıq *(Böyük Britaniya və Şimali İrlandiya)*; 2. aləm; **animal/vegetable ~** heyvanlar/bitkilər aləmi

**king-size** ['kıŋsaız] *adj* ən böyük, çox iri; uzun; **a ~ bed** çox böyük çarpayı; **~ cigarette** iri/uzun siqaret; **~ portions** böyük paylar

**kinsman** ['kınzmən] *n (pl* **-men***)* qan qohumu

**kinswoman** ['kınz͵wumən] *n (pl* **-women** [-͵wımın]) qohum *(qadın)*

**kiosk** [kı'ɔsk] *n* kiosk; köşk; budka; **telephone ~** telefon budkası

**kismet** ['kısmet] *n* qismət, tale; Allahın hökmü

**kiss¹** [kıs] *n* öpüş; **ardent ~** ehtiraslı öpüş; **farewell ~** vida öpüşü; **to give** *smb.* **a ~** bir kəsi öpmək; **to give a ~ on the cheek** yanaqdan öpmək

**kiss²** [kıs] *v* 1. öpmək; **to ~** *smb.* **on the lips** bir kəsin dodaqlarından öpmək; *The girl kissed him on the lips Qız onun dodaqlarından öpdü*; 2. sığallamaq, sığal çəkmək, oxşamaq; *The wind gently kissed her hair Külək onun saçını xəfifcə sığalladı*; 3. bir-birinə ehmalca toxunmaq *(bilyard şarları haq.)*;

◊ **to ~ the book** İncili/Quranı öpmək, and içmək *(məhkəmədə)*

**kitchen¹** ['kıtʃın] *n* mətbəx; **large/light ~** geniş /işıqlı mətbəx

**kitchen²** ['kıtʃın] *adj* mətbəx; **the ~ table** mətbəx stolu; **~ maid** mətbəx qulluqçusu; **~ knife** mətbəx bıçağı; **~ garden** dirrik, xir, bostan;

**kitchenware** ['kıtʃınweə'] *n* mətbəx avadanlığı, qab-qacaq



**kite** [kaıt] *n* 1. çərpələng; **to fly a ~** çərpələng uçurtmaq; 2. çalağan; 3. fırıldaqçı, haramzada, hiyləbaz, hiyləgər

**kitten¹** ['kıtn] *n* pişik balası; **to have ~s 1)** balalamaq *(pişik, dovşan və s.)*; **2)** *jarq.* səs-küy qaldırmaq, narahat olmaq/etmək

**kitten²** ['kıtn] *v* balalamaq *(pişik, dovşan və s. haq.)*

**kittenish** ['kıtnıʃ] *adj* oynaq, şux, şən, nadinc, dəcəl, gümrah

**kitty** ['kıtı] *n* pişik balası; pişik

**knack** [næk] *n* 1. bacarıq, qabiliyyət, məharət; çəldlik, zirəklik; ustalıq; **to have a ~ of/for doing** *smth.* bir işi görmək üçün bacarığı/ qabiliyyəti/ məharəti olmaq; **to have a ~ for business /for management** işgüzarlıq/təşkilatçılıq bacarığı olmaq; **to possess a ~ at languages** dilləri öyrənməyə qabiliyyəti/məharəti/istedadı olmaq; 2. biclik, hiyləgərlik, hiylə, fənd

**knacky** ['nækı] *adj* bacarıqlı, məharətli, mahir, qabiliyyətli, usta; cəld, çevik, diribaş

**knapsack** ['næpsæk] *n* dal/arxa çantası

**knapweed** ['næpwi:d] *n bot.* peyğəmbərçiçəyi *(açıq göy rəngli çöl çiçəyi)*

**knave** [neıv] *n* 1. alçaq, əclaf, namərd; fırıldaqçı, hiyləgər, dələduz; **base/shrewd/ arrant ~** alçaq/bic/qatı fırıldaqçı *(adam)*; 2. valet *(kart kağızlarındakı şəkillərdən biri)*;

◊ **a ~ in grain** ən qatı fırıldaqçı/hiyləgər/yaramaz; **a ~ of hearts** arvadbaz, qadın düşkünü

**knavery** ['neıvərı] *n* fırıldaq, hiyləgərlik, dələduzluq, kələkbazlıq, fırıldaqçılıq, haramzadalıq; aldatma; **to brew ~** hiyləgərlik/fırıldaqçılıq/dələduzluq etmək; **to confess ~** fırıldaqçılığı/dələduzluğu boynuna almaq

**knavish** ['neıvıʃ] *adj* 1. fırıldaqçı, hiyləgər, dələduz, kələkbaz, bic; 2. nadinc, dəcəl, şuluq; **~ lad** dəcəl/nadinc/şuluq oğlan; **a ~ piece of work 1)** əyri /şərəfsiz iş; dələduzluq, fırıldaqçılıq; *It's downright knavish Bu sadəcə olaraq fırıldaqdır/dələduzluqdur*; **2)** dəcəllik, nadinclik, şuluqluq

**knavishly** ['neıvıʃlı] *adv* fırıldaqçılıqla, dələduzluqla, kələkbazlıqla, hiyləgərliklə, aldatma yolu ilə

**knead** [ni:d] *v* 1. yoğurmaq *(xəmiri)*, tutmaq *(palçıq)*; 2. masaj etmək, ovmaq, ovuşdurmaq

**knee¹** [ni:] *n* 1. diz; **feeble ~s** zəif dizlər; **to dislocate/to hurt the ~** dizini burxutmaq/ əzmək; *His leg is amputated at the knee Onun qıçı dizdən kəsilib; Knees weaken/shake Dizlər zəifləyir/əsir*; **to go/to drop/to fall on** ***one's*** **~s 1)** dizi üstə çökmək; **2)** yalvarmaq; **to go (down) on** ***one's*** **~s to** ***smb.*** bir kəsin qarşısında diz çökmək; **to beseech on** ***one's*** **~s** diz çöküb yalvarmaq; **to bring to ~s** diz çökdürmək; **to bring** ***smb.*** **to his ~s** bir kəsi diz çökdürmək; 2. diz *(paltarda)*; **the ~s of a pair of trousers** şalvarın dizləri; *These pair of trousers are torn at the knee Bu şalvarın dizi yırtılıb/cırılıb*;

◊ **to sit ~ by ~** diz-dizə oturmaq; **to offer/to give a ~ to** ***smb.*** 1) bir kəsə kömək/ yardım etmək; 2)bir kəsə sekundant olmaq *(boksda)*; **to learn** ***smth.*** **at** ***one's*** **mother's ~s** bir şeyi uşaqlıqda/anasının bətnində öyrənmək

**knee²** [ni:] *v (pt, pp* **kneed** [ni:d]) dizi ilə toxunmaq/vurmaq; **to ~** ***smb./smth.*** bir kəsi/şeyi dizi ilə vurmaq

**knee-cap** ['ni:kæp] *n anat.* diz qapağı

**kneed** [ni:d] *adj* 1. dirsəkli, dirsəkvarı, dirsəkşəkilli; 2. dizə/dirsəyə qədər çırmanmış *(şalvar haq.)*; 3. buğum-buğum *(gövdə, saplaq haq.)*

**knee-deep¹** ['ni:'di:p] *adj* dizə qədər; *The snow was knee-deep in places Bəzi yerlərdə qar dizə qədər idi*

**knee-high** ['ni:'haı] *adj* diz hündürlükdə, dizə qədər; **~ grass** diz hündürlükdə/dizə qədər ot

**knee-length** ['ni:leŋθ] *adj* dizə kimi/qədər; **a ~ skirt** dizə qədər/kimi yubka

**knee-joint** ['ni:dʒɔınt] *n anat.* diz oynağı

**kneel** [ni:l] *v (pt, pp* **knelt** [nelt] *və ya* **knelled** [-d]) 1. dizi üstə çökmək *(həm də* **to ~ down***)*; 2. dizi üstə durmaq/dayanmaq; **to ~ in prayer** dizi üstə dua etmək; **to ~ to/before** ***smb.*** bir kəsin qarşısında diz çökmək; *She went into the church, knelt (down) and began to pray O, kilsəyə getdi, diz çökdü və dua etməyə başladı*

**knell** [nel] *n* 1. dəfn zəngi *(xristianlarda adam ölərkən çalınan zəng)*; **doleful ~** ələmli/kədərli zənc səsi; **funeral ~** dəfn zəngi; **to sound a ~** ölüm haqqında xəbər vermək *(kilsədə zəng çalmaqla)*; **to sound/to ring the death ~ for/of** ***smth.*** bir şeyin məhv olmasını bildirmək üçün kilsə zənglərini çalmaq; 2. ağı demə, acı-acı ağlama

**knew** [nju:] **to know** *felinin pt forması*

**knickerbockers** ['nıkəbɔkəz] *n (özündən sonra fel cəmdə işlədilir)* bric *(at minmək üçün şalvar)*

**knickers** ['nıkəz] *n (Özündən sonra fel cəmdə işlənir)* 1. **knickerbockers** *isminin qısa forması*; 2. darbalaq, dizlik *(qadınların və qızların alt paltarı)*; 3. idman şalvarı;

◊ **to get** ***one's*** **~ in a twist** bərk əsəbiləşmək/acıqlanmaq/özündən çıxmaq, tumanını başına çevirmək; *There's no need to get your knickers in a twist –we've got two hours before the plane leaves Əsəbiləşməyə ehtiyac yoxdur, təyyarənin uçmasına hələ iki saat var/təyyarənin uçmasına qədər bizim iki saat vaxtımız var*

**knick-knack** *(həm də* **nick-nack** ['nıknæk] *n* ucuz bəzək-düzək; **a collection of ~s** ucuz bəzək-düzək kolleksiyası

**knick-knackery** [͵nık'nækərı] *n top. i* 1. ucuz bəzək-düzək şeyləri; oyuncaqlar; 2. güləbətin

**knick-knackish** ['nık͵nækıʃ] *adj* 1. əhəmiyyətsiz, boş, cəfəng, mənasız; yüngül, əsassız, səthi; 2. qəlp, saxta, yalançı, oyuncaq

**knife¹** [naıf] *n (pl* **knives***)* bıçaq; **kitchen ~** mət-

box bıçağı; **fruit ~** meyvə bıçağı; **to put the knives and forks on the table** bıçaqları və çəngəlləri stolun üstünə qoymaq; **the assassin's ~** qatil bıçağı; **the surgeon's ~** cərrah bıçağı; **to have a horror of the ~** cərrahiyyə əməliyyatından bərk qorxmaq; **to go under the ~** cərrahiyyə əməliyyatına məruz qalmaq, operasiya olunmaq; *He was under the knife for two hours O, iki saat bıçaq altında qaldı, Onun cərrahiyyə əməliyyatı iki saat çəkdi*; **to die under the ~** cərrahiyyə əməliyyatı vaxtı/zamanı ölmək;

◊ *The knives are out ≅ Xəncər çıxdı, qan çıxdı*; **like a ~ through butter** bıçaq yağı kəsən kimi, çox asan; **to make/to wage war to the ~** amansız dava/müharibə etmək; **to have/to get *one's* ~ into *smb.*** bir kəsə amansız hücum etmək, bir kəsi amansızcasına/kəskin tənqid etmək; **to play a good ~ and fork** iştaha ilə/ yaxşı-yaxşı yemək

**knife²** [naıf] *v* bıçaqlamaq, bıçaqla kəsmək; bıçaqla zərbə endirmək; **to be ~ed to death** bıçaqla ölümcül yaralanmaq; *The man had been knifed in the chest Kişi sinəsindən bıçaqlanmışdı*

**knife-edge** [ˈnaıfedʒ] *n* bıçağın ağzı/tiyəsi

**knife-edged** [ˈnaıfedʒd] *adj* iti, itilənmiş

**knife-file** [ˈnaıffaıl] *n* bıçaq əyəsi/törpüsü

**knife-grinder** [ˈnaıf.graındəʳ] *n* 1. bıçaqitiləyən; 2. bülöv daşı

**knife-switch** [ˈnaıfswıtʃ] *n el.* rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*

**knight¹** [naıt] *n* 1. rıtsar *(Qərbi Avropada feodalizm dövründə: hərbi-zadəgan təbəqəsinə mənsub olan şəxs)*, cəngavər; pəhləvan; **armed ~** silahlı rıtsar/cəngavər; **valiant/dauntless ~** rəşadətli/cəsarətli cəngavər; 2. nəcib/alicənab adam; 3. irsən keçməyən zadəgan rütbəsi; 4. atlı *(qədim Romada)*; 5. *şahm.* at *(şahmat fiquru)*

**knight²** [naıt] *v* 1. rıtsarı/cəngavəri tərənnüm etmək; 2. rıtsar/cəngavər titulu vermək; **to be ~ed for war services** müharibədəki xidmətinə görə rıtsar/cəngavər adı verilmək/almaq; *He was knighted by the Queen for his services to industry Sənayedəki xidmətlərinə görə Kraliça ona rıtsar adı verdi*

**knightage** [ˈnaıtıdʒ] *n tar.* 1. *top. i.* rıtsarlar *(Qərbi Avropada: feodalizm dövründə hərbi-zadəgan təbəqəsi)*; 2. rıtsarlıq *(rıtsar adı)*; 3. *məc.* alicənablıq, mərdlik, comərdlik

**knight-errant** [ˈnaıtˈernt] *n (pl* **knights-** [naıts-]) 1. gəzən/gəzərgi rıtsar; 2. *məc.* donkixot, xəyalpərəst, xülyaçı

**knighthood** [ˈnaıthud] *n* 1. rıtsar adı/titulu; rıtsarlıq; 2. *top. i tar.* rıtsarlar, rıtsar zümrəsi; 3. alicənablıq, nəciblik, mərdlik, comərdlik

**knightly¹** [ˈnaıtlı] *adj* 1. rıtsar, rıtsara yaraşan; 2. nəcib, alicənab, mərd; **~ actions** nəcib/ mərd/ alicənab hərəkətlər

**knightly²** [ˈnaıtlı] *adv* rıtsar kimi, rıtsara yaraşan bir tərzdə; alicənabcasına, alicənablıqla, fədakarcasına, mərdcəsinə

**knit¹** [nıt] *n* 1. hörmə, toxuma, hörülmə, toxunma; 2. trikotaj, toxunmuş şey/mal

**knit²** [nıt] *adj* toxunmuş, hörülmüş

**knit³** [nıt] *v (-tt-; pt, pp* **knitted** [-ıd] *və ya* **knit**) 1. toxumaq, hörmək; **to ~ wool into stockings, to ~ stockings out of wool** yundan corab toxumaq/hörmək; **to ~ by hand/by machine** əllə /maşınla toxumaq; **to ~ a sweater** sviter toxumaq; 2. bağlamaq, birləşdirmək, bərkitmək; *Mortar knits bricks together Əhəng kərpicləri bir-birinə bərkidir/bitişdirir*; **to ~ broken bones together** sınmış sümükləri bir yerə birləşdirmək; **to ~ together by marriage** kəbinlə birləşdirmək; *They are knit together by common interest Onları ümumi maraq birləşdirir*; 3. çatılmaq, çatmaq *(qaşları)*; **to ~ *one's* brows** qaşlarını çatmaq; *His brows knit in thought Fikir içərisində onun qaşları çatıldı*

**knitter** [ˈnıtəʳ] *n* 1. toxucu; 2. toxucu maşın

**knitting** [ˈnıtıŋ] *n* 1. toxuma, toxunma; 2. toxunma məmulatı/malları

**knitting-machine** [ˈnıtıŋməˈʃi:n] *n* toxucu maşın

**knitting-needle** [ˈnıtıŋ.ni:dl] *n* toxuma iynəsi

**knitting-pin** [ˈnıtıŋpın] *n* toxuma mili

**knitwear** [ˈnıtweəʳ] *n* trikotaj, trikotaj məmulatı

**knives** [naıvz] *n* **knife** *isminin cəm forması*

**knob** [nɔb] *n* 1. qabarıqlıq, çıxıntı; 2. girdə dəstək *(qapıda, qutuda)*; *This knob doesn't work Bu dəstək çevrilmir/dönmür /işləmir*; 3. dəstə, qulp, sap; əl ağacının başı; 4. şiş, fır, törəmə *(ağacın və s. bitkilərin gövdəsində)*; 5. *d.d.* baş, kəllə

**knobbed** [nɔbd] *adj* 1. kələ-kötür, fırlı; fırla örtülmüş; 2. təpəli, dərə-təpəli

**knobby** [ˈnɔbı] *adj* 1. kələ-kötür, fırlı; düyünlü, düyün-düyün; təpəlik, təpələrlə örtülü; 2. qabarıq, qabarıqlı

**knock¹** [nɔk] *n* 1. tıqqıltı, taqqıltı; **to give a ~** tıqqıldatmaq *(qapını)*; *There was a knock at the door Qapıda tıqqıltı vardı, Qapını tıqqıldatdılar*; 2. zərbə; itələmə, təkan; **hard ~** ağır zərbə; **a ~ on the head** başa zərbə; *She fell off her bike and got a nasty knock on her leg O, velosipedindən yıxıldı və ayağından bərk zərbə aldı*; 3. *tex.* detonasiya, ahəngin pozulması *(mühərrikin işləməsində)*, tıqqıltı *(mühərrikdə)*;

◊ **to get the ~** 1) işdən qovulmaq; 2) sərxoş olmaq, keflənmək

**knock²** [nɔk] *v* 1. döymək *(qapını)*, tıqqıldatmaq; **to ~ sharply/hard** ucadan/bərkdən tıqqıldatmaq; **to ~ for admittance** daxil olmaq üçün döymək *(qapını)*; **to ~ at/on the door/window** qapını/pəncərəni döymək; 2. vurmaq; zərbə endirmək; döyəcləmək; **to ~ the ball hard** topa bərk vurmaq; **to ~ *smb.* on the head** bir kəsin başına vurmaq/zərbə endirmək; **to ~ *smth.* from *smb.'s* hand** bir şeyi bir kəsin əlindən vurub salmaq; **to ~ *smth.* to pieces** bir şeyi vurub parça-parça etmək; 3. *tex.* ahəngsiz işləmək, taqqıltı



salmaq *(mühərrik və s. haq.)*; **to ~ about** *d.d.* veyllənmək, avara-avara gəzmək/dolaşmaq; **to ~ about the world** 1) dünyanı dolaşmaq/gəzmək; 2) *d.d.* pozğun/əxlaqsız həyat sürmək; 3) kobud/qaba rəftar etmək *(bir kəslə)*; **to ~ against** təsadüfən qarşılaşmaq *(bir kəslə)*; **to ~ down** 1) yıxmaq, vurub yıxmaq; *He knocked his enemy down O, düşmənini vurub yıxdı*; 2) uçurmaq, dağıtmaq *(tikilini)*; **to ~ a house down** evi uçurmaq; 3) aşağı salmaq, endirmək *(qiyməti)*; **to ~ the price down to $ 45** qiyməti 45 $ dollara qədər aşağı endirmək/salmaq; 4) hərracda satmaq; **to ~ in** çalmaq, vurmaq *(mıxı)*; **to ~ in a nail** mıx vurmaq/çalmaq; **to ~ a nail into a wall** divara mıx vurmaq/çalmaq; **to ~ off** 1) çırpmaq *(tozu)*; **to ~ the dust off *one's* coat** paltosunun tozunu çırpmaq; 2) azaltmaq *(sürəti)*; *The accident knocked ten knots off the speed of the vessel Qəza gəminin sürətini saatda on dəniz milinə qədər azaltdı*; **to ~ out** 1) qalib gəlmək; 2) *id.* nokaut etmək, nokautla sıradan çıxartmaq; 3) məğlub etmək, sıradan çıxartmaq; **to ~ over** əldən salmaq; **to be ~ed over with fever** qızdırmadan üzülmək/əldən düşmək; **to ~ under** tabe/təslim olmaq, itaət etmək, boyun əymək; **to ~ under to *one's* fate** taleyinə boyun əymək;

◊ **to ~ at an open door** hamıya aydın olan bir şeyi isbat etməyə çalışmaq; **to ~ *smb.'s* head off** bir kəsi qabaqlamaq/ötüb keçmək/geridə buraxmaq; **to ~ *smb.* off his pins** bir kəsi son dərəcə heyrətləndirmək / heyrətə salmaq/ çaşdırmaq

**knock-down¹** [ˈnɔkˈdaun] *n* 1. sarsıdıcı/dağıdıcı zərbə; 2. yumruq davası; dava, vuruşma, dalaşma; 3. *id.* nokdaun; 4. *d.d.* tünd pivə/şərab

**knock-down²** [ˈnɔkˈdaun] *adj* 1. ağır, sarsıdıcı, dağıdıcı *(zərbə haq.)*; **~ blow** ağır/ dağıdıcı zərbə; 2. sökülən, sökülüb quraşdırılan, sökülə bilən *(mebel və s. haq.)*

**knocker** [ˈnɔkəʳ] *n* 1. qapı toxmağı/halqası; 2. *amer. d.d.* hər şeyə irad tutan, hər şeyə əmma /qulp qoyan, hər şeydən əmma çıxaran *(adam)*

**knocking** [ˈnɔkıŋ] *n* 1. taqqıltı, tıqqıltı; 2. detonasiya *(mühərrikdə)*

**knock-out** [ˈnɔkaut] *n* 1. *id.* nokaut, məğlubiyyət; 2. sensasiya *(çox böyük təsir oyadan hadisə/xəbər)*; 3. *amer. d.d.* qəşəng oğlan/kişi, gözəl/qəşəng qız, nazənin

**knot¹** [nɔt] *n* 1. düyün; **tight ~** bərk /tarım düyün; **to make/to tie a ~** düyünləmək, düyün bağlamaq/vurmaq; **to make a ~ at the end of the rope** ipin/kəndirin ucunu düyünləmək; **to loosen a ~** düyünü boşaltmaq; **to undo a ~** düyünü açmaq; 2. əlaqə, birlik; **wedding/marriage ~** kəbin əlaqəsi; **to tie the ~** kəbin əlaqəsinə girmək, ərə getmək, evlənmək; 3. qaytan, bağ; bant; bafta; 4. kələf, yumaq; dolaşıq yumaq/kələf; 5.; dolaşıq vəziyyət; **inextricable/intricate ~** çıxılmaz/dolaşıq vəziyyət; 6. ən əsas/vacib məsələ/an; **the ~ of the matter** ən əsas məsələ; 7. qrup, dəstə; **a little ~ of boys** bir dəstə/qrup oğlan; **to stand in ~s** qrup halında dayanmaq; 8. şiş, fır, törəmə; **to feel a ~ under the skin** dəri altında şiş/fır hiss etmək; 9. budaq *(ağacda)*; düyün *(taxtada)*;

◊ **porter's ~** hambal palanı

**knot²** [nɔt] *v (-tt-)* 1. düyün bağlamaq, düyünləmək, bağlamaq; **to ~ two ropes together** iki ipi/kəndiri bir-birinə bağlamaq; **to ~ *one's* tie** qalstukunu bağlamaq; 2. düyünləşmək, dolaşmaq; *This thread knots easily Bu sap asanlıqla/tez dolaşır*; 3. dolaşdırmaq, dolaşıq salmaq; 4. fır/şiş əmələ gətirmək; 5. çatmaq *(qaşı)*; qaşqabağını tökmək, sımsırığını sallamaq; 6. düyünü təmizləmək *(taxtada)*

**knotty** [ˈnɔtı] *adj (-ier, -iest)* 1. düyünlü, düyün-düyün; **~ wood** düyünlü taxta; 2. dolaşıq, çətin; **a ~ problem/question** dolaşıq problem/məsələ

**know** [nou] *v (pt* **knew** [nju:]; *pp* **known** [noun]) 1. bilmək; **to ~ *smb.'s* name/ address** bir kəsin adını/ünvanını bilmək; *She doesn't know your address O sənin/ sizin ünvanını/ünvanınızı bilmir*; **to ~ all about *smth.*** bir şey haqqında hər şeyi bilmək; **to ~ *one's* lesson** dərsini bilmək; **to ~ a foreign language** bir xarici dil bilmək; **to ~ *smth.* thoroughly/superficially** bir şeyi ətraflı/səthi bilmək; *He knows what he's talking about O nə haqda danışdığını bilir; Every child knows (that) two and two make four Hər bir uşaq bilir ki, iki üstəgəl iki dörd eylər*; 2. bacarmaq, bilmək; **to ~ to read/to write/to swim/to dance,** *etc.* oxumağı/yazmağı/üzməyi/rəqs etməyi *və s.* bacarmaq/bilmək; 3. tanımaq; **to ~ *smb.*** bir kəsi tanımaq; *Do you know Bob Hill? Sən/Siz Bob Hili tanıyırsanmı?/ tanıyırsınızmı?; I know London well Mən Londonu yaxşı tanıyıram*; **to ~ *smb.* intimately** bir kəsi yaxından tanımaq; **to ~ *smb.* personally** bir kəsi şəxsən tanımaq; **to get to ~ *smb.* better** bir kəsi daha yaxından tanımaq; **to ~ *smb.* by his voice/walk** bir kəsi səsindən /yerişindən tanımaq; **to ~ *smb.* at a distance** bir kəsi uzaqdan tanımaq; 4. etiraf etmək, boynuna almaq; dərk etmək; **to ~ *one's* mistakes /faults** öz səhvlərini /qüsurlarını etiraf etmək; *She doesn't know her own mind O nə istədiyini dərk etmir*; 5. acısını duymaq/dadmaq/görmək, başına gəlmək, yaşamaq; **to ~ poverty** aclıq çəkmək, aclığın nə olduğunu bilmək; 6. fərqləndirmək; **to ~ a friend from a foe/good from evil** dostu düşməndən/yaxşını yamandan fərqləndirmək;

◊ **to ~ what's what** nəyin nə olduğunu bilmək, bir şeyi başa düşmək, işlərin nə yerdə olduğunu bilmək; **to ~ *one's* own business** özgənin işinə qarışmamaq, öz işi ilə məşğul olmaq; *Heaven only knows! Ancaq Allah bilir!*

**knowing¹** [ˈnouıŋ] *n* 1. bilik, məlumat; *There's no knowing what their next move will be Bilmək ol-*

*mur onların növbəti hərəkəti nə olacaq; There's no knowing what the weather will be Bilmək olmur hava necə olacaq*; 2. anlama, dərk etmə/edilmə; **beyond** ***smb.'s*** **~** bir kəsin anlamından kənar

**knowing²** ['nouɪŋ] *adj* 1. bilən, anlayan, mənalı; **~ look** mənalı baxış; 2. idrak; əqli fəaliyyətə aid olan; **ordinary ~ faculties** orta əqli fəaliyyət/idrak qabiliyyəti; 3. *d.d.* cəld, diribaş, zirək, çevik; bacarıqlı, fəndgir; **~ fellow** zirək/çevik/bacarıqlı oğlan; 4. *d.d.* qəsdən/qərəzlə/bilə-bilə edilən, qabaqcadan düşünülmüş; 5. *d.d.* şıq, yaraşıqlı, bahalı; dəbdə olan; **~ hat** dəbdə olan bahalı şlyapa

**knowingly** ['nouɪŋlɪ] *adv* 1. qəsdlə, qəsdən, bilə-bilə, şüurlu olaraq, bilərəkdən, müəyyən məqsədlə; **to kill ~** qəsdlə/qəsdən öldürmək; *I would never knowingly lie to you Mən heç vaxt səni/sizi bilərəkdən aldatmaram*; 2. cəld, bacarıqla, məharətlə

**knowledge** ['nɔlɪdʒ] *n* 1. bilgi, bilik; **~ of life/music /chemistry/English,** ***etc.*** həyat/musiqi/kimya /ingilis dili haqqında bilik; **~ on the subject** fənn haqqında/üzrə bilik; **lack of ~** biliksizlik; **branches of human ~** bəşər biliklərinin sahələri; **a matter of common ~** hamıya aydın olan məsələ; **to accumulate/to acquire/to get ~** bilik toplamaq/əldə etmək/almaq; **to have limited ~ of** ***smth.*** bir şey haqqında məhdud biliyə malik olmaq; 2. anlama, anlayış; **to have no ~ of good and evil** yaxşı və yaman haqqında anlayışı olmamaq; *A baby has no knowledge of the difference between good and evil Körpənin yaxşı ilə yaman arasındakı fərq haqqında anlayışı olmur*; 3. məlumat, məlumatı olma; **first-hand ~** ilkin mənbədən məlumat; *The knowledge of victory soon spread Qələbə haqqında məlumat tezliklə yayıldı; She has sent the document without my knowledge O, sənədi mənim məlumatım/xəbərim olmadan göndərib*; **to the best of my ~** mənə məlum olduğuna görə; **to my ~** mən bildiyimə görə; *To my knowledge, she has never been late before Mənim bildiyimə görə, o, əvvəllər heç vaxt gecikməyib*

**knowledgeable** ['nɔlɪdʒəbl] *adj* yaxşı məlumatlı, ağıllı, zəkalı, kamallı; **a ~ man** ağıllı/zəkalı adam; *She is extremely/immensely knowledgeable about art O, incəsənət haqqında həddindən artıq məlumatlıdır, Onun incəsənət haqqında məlumatı çoxdur*

**knowledgeably** ['nɔlɪdʒəblɪ] *adj* ağıllı, ağılla, kamalla, kamallı

**known¹** [noun] **to know** *felinin pp forması*

**known²** [noun] *adj* məlum; tanınmış; **~ quantity** *riyaz.* məlum kəmiyyət/ədəd; *He is a known thief O, tanınmış oğrudur*

**know-nothing** ['nou.nʌθɪŋ] *n* nadan, qanmaz, qanacaqsız, qaba *(adam)*

**knuckle** ['nʌkl] *n* oynaq, buğum; **swollen ~s** şişmiş oynaqlar

**knuckle-bone** ['nʌklboun] *n* 1. *anat.* aşıq; 2. aşıq-aşıq oyunu

**knuckle-joint** ['nʌkldʒɔɪnt] *n* 1. barmaq oynağı; 2. *tex.* həncama, şarnir

**knuckles** ['nʌklz] *n* aşıq-aşıq oyunu

**koala** [kou'a:lə] *n (həm də* **ko'ala bear)** *zool.* koala *(Avstraliyada yaşayan kisəli ayı)*

**kodak¹** ['koudæk] *n* kodak fotoaparatı

**kodak²** ['koudæk] *v* kodak fotoaparatı ilə şəkil çəkmək

**Koran** *(həm də* **Qur'an)** [kɔ'ra:n] *n* Quran

**Korean¹** [kə'rɪən] *n* 1. koreyalı; **the ~s** *top. i* koreyalılar; 2. Koreya dili

**Korean²** [kə'rɪən] *adj* Koreya; **the ~ language** Koreya dili

**Kremlin** ['kremlɪn] *n* Kreml *(qədim rus şəhərlərində iç qala)*; **the Kremlin** Kreml *(Moskvada)*

**krona** ['krounə] *n* krona *(İsveçrədə pul vahidi)*

**krone** ['krounə] *n (pl* **-ner** [nə']) kron *(Norveçdə və Danimarkada əsas pul vahidi)*

**kudos** ['kju:dɔs] *n d.d.* hörmət, izzət, ehtiram, şərəf; **to win ~** hörmət/şərəf qazanmaq; **to lose ~** hörməti/şərəfi/izzəti itirmək; *I did most of the work, but all the kudos went to him İşin əsas hissəsini mən gördüm, lakin hörməti/şərəfi o qazandı*



# Ll

**L l** [el] *n (pl* **L's, l's** [elz]) *ingilis əlifbasının 12-ci hərfi*

**L¹** [el] *n* 1. L hərfi formasında olan şey/əşya; 2. rum rəqəminin 50-ci rəqəmi

**L²** [el] *n* **lake** *sözünün qısa forması (xüs. xəritədə)*

**L³** [el] *n* **Latin** *sözünün qısa forması*

**la** [la:] *n mus.* lya *(musiqi qammasında 6-cı not)*

**Lab** [læb] *n* **Labour party** *söz birləşməsinin qısa forması*

**lab** [læb] *n d.d.* = **laboratory**

**label¹** ['leɪbl] *n* 1. yarlıq, etiket; **to put ~ on** ***one's*** **luggage** bağlamasının üstünə yarlıq vurmaq/yapışdırmaq; *Tie an address label on your luggage Bağlamanın/Bağlamanızın üstünə ünvan yarlığı yapışdır/yapışdırın*; 2. adlandırma, damğa vurma *(xüs. əsassız)*; **to stick/to slap a ~ on** ***smb./smth.*** bir kəsə/şeyə damğa vurmaq *(əsassız olaraq)*, bir kəsi/şeyi adlandırmaq

**label²** ['leɪbl] *v* (-ll-) 1. yarlıq/etiket yapışdırmaq/vurmaq; *All the boxes were labelled Bütün qutulara yarlıq yapışdırıldı*; 2. adlandırmaq *(xüs. əsassız olaraq); His enemies labelled the boy a thief Düşmənləri oğlanı oğru adlandırdılar*

**labelled** ['leɪbld] *adj* 1. nişanlanmış; **~ atom** nişanlanmış atom; 2. üzərinə etiket yapışdırılmış/vurulmuş; **~ boxes** etiket yapışdırılmış qutular

**labial¹** ['leɪbjəl] *n fon.* dodaq səsi

**labial²** ['leɪbjəl] *adj* dodaq, dodaqlanan; **~ sounds** dodaq səsləri, dodaqlanan səslər

**labialization, -isation** [ˌleɪbjəlaɪzeɪʃn] *n fon.* dodaqlanma, dodaq vasitəsilə tələffüz edilmə *(səs haq.)*

**labialize, -ise** ['leɪbjəlaɪz] *v* dodaqlanmaq, dodaqlandırmaq

**labile** ['leɪbɪl] *adj* qeyri-sabit, nataraz, qeyri-bərabər; **~ equilibrium** qeyri-bərabərlik, qeyri-bərabər *(tənlik)*, bərabər olmayan

**lability** [lə'bɪlɪtɪ] *n* natarazlıq, qeyri-bərabərlik

**labio-** ['leɪbɪou] *mürəkkəb sözlərin komponenti:* **~nasal** dodaq-burun *(samiti)*

**labio-dental** [ˌleɪbɪou'dentl] *adj fon.* dodaq-diş; **~ consonant** dodaq-diş samiti

**labor** ['leɪbə'] *n amer.* = **labour**

**laboratorial** [ˌlæbərə'tɔ:rɪəl] *adj* laborator, laboratoriyada işlənən

**laboratory** [lə'bɔrətrɪ] *n* 1. laboratoriya; **hot ~** işlək/qaynar laboratoriya; **~ of the minds/ideas** əqli iş; 2. metal vanna, tas *(metaldan hazırlanmış məişət əşyası)*; 3. işçilər üçün ayrılmış boş yer/ sahə; **~ report** laboratoriya tədqiqatlarının nəticələri; **~ routine** laboratoriya təcrübəsi; **~ test** laboratoriya testi/sınağı; laboratoriyada sınaqdan keçirilmə

**labour¹** ['leɪbə'] *n* 1. əqli/fiziki iş; *The majority of men earn their living by manual labour Adamların əksəriyyəti öz yaşayışlarını fiziki əməklə təmin edirlər*; **hard ~** 1) ağır iş; 2) *hüq.* cəza tədbiri olaraq cinayətkara kəsilən/verilən iş, həbs qəti imkan tədbiri; **~ saving** ağır əməyi yüngülləşdirən; **~ saving devices** ağır əməyi yüngülləşdirən vasitələr; 2. tapşırıq, iş; **a ~ of love** ürəyi istəyən/sevdiyi iş/tapşırıq; 3. bir qəbildən olan işlər; 4. uşağın anadan olma/ doğulma prosesi; **a woman in ~** doğan qadın

**labour²** ['leɪbə'] *adj* iş, əmək; **~ relations** əmək münasibətləri; **Labour Exchange** fəhlələri işə götürən dövlət agentlikləri; **Labour Party** Leyboristlər partiyası *(İngiltərədə mövcud olan iki ən böyük partiyadan biri)*; **Labour leaders** Leyboristlər partiyasının liderləri; **the Labour vote** Leyboristlərə verilən səs; **Labour Day** *amer.* sentyabr ayının birinci bazar ertəsi günü *(fəhlə sinfinin şərəfinə qeyd edilən rəsmi bayram)*

**labour³** ['leɪbə'] *v* 1. işləmək, çalışmaq; **to ~ for the happiness of mankind** insanların/ bəşəriyyətin xoşbəxtliyi naminə çalışmaq; **to ~ at a task** bir işin üzərində işləmək/çalışmaq; **to ~ to complete a task** bir tapşırığı tamamlamaq üçün çalışmaq; **to ~ in the cause of peace** sülh işi naminə çalışmaq; 2. çətinliklə getmək/irəliləmək; *The ship laboured through the heavy seas Gəmi təlatümlü dənizlərdə ağır-ağır getdi/irəlilədi; The old man laboured up the hill Qoca kişi çətinliklə təpəliyə çıxdı/qalxdı*; 3. əziyyət çəkmək; **to ~ under** ***smb./smth.*** bir kəsə/ şeyə görə əziyyət çəkmək

**Labour Day** ['leɪbə'deɪ] *n amer.* zəhmət günü *(sentyabrın ilk bazar ertəsi)*

**laboured** ['leɪbəd] *adj* çətin, əziyyətli; **~ breathing** çətin nəfəs alma; **a ~ style of writing** çətin oxunan yazı üsulu, pis xətt

**labourer** ['leɪbərə'] *n* ağır əl işi ilə məşğul olan əməkçi; **agricultural ~s** ferma fəhlələri, kənd təsərrüfatı işçiləri

**labouring** ['leɪbərɪŋ] *adj* 1. zəhmətkeş, əfakeş; **a ~ man** zəhmətkeş adam; **~ classes** fəhlə sinfi; **~ population** işləyən əhali; 2. bərk döyünən *(ürək haq.)*; 3. atılıb-tutulmağa məruz qalan *(gəmi haq.)*

**labourism** ['leɪbərɪzm] *n* leyborizm

**labourist** ['leɪbərɪst] *n* 1. zəhmətkeş, əməkçi; 2. leyborist, leyborist partiyasının üzvü

**labourless** ['leɪbəlɪs] *adj* əmək tələb etməyən, zəhmətsiz, zəhmətsiz əldə edilən, asan

**labour-market** ['leɪbə'ma:kɪt] *n* 1. fəhlə/qul bazarı; 2. əməyə olan tələb

**labour-saving** ['leɪbə'seɪvɪŋ] *adj* əl əməyini yüngülləşdirən, səmərələşdirici *(təklif, iş haq.)*
**laboursome** ['leɪbəsəm] *adj* əziyyətli, çətin, ağır; **~ work/job** əziyyətli iş
**laburnum** [lə'bə:nəm] *n bot.* nəfəsotu
**labyrinth** ['læbərɪnθ] *n* **1.** labirint; giriş-çıxışı bəlli olmayan yol; *He was trying to find his way through the labyrinth O, labirintdən çıxış yolu axtarırdı;* **2.** *anat.* labirint *(qulaq daxili)*
**labyrinthine** ['læbərɪnθɪn] *adj* labirintli, mürəkkəb, yolu çətin, dolaşıq
**lace**[1] [leɪs] *n* **1.** şəbəkə, tor, haşiyə; **a dress trimmed with ~** torla haşiyələnmiş paltar; **2.** sapla toxunmuş bəzəkli şəbəkə; **3.** ayaqqabı bağı, qaytan
**lace**[2] [leɪs] *v* **1.** bağla/qaytanla bağlamaq; **2.** iplə bərkitmək; **3.** hörmək *(iplə)*; **4.** qamçı ilə vurmaq/döymək; **5.** qatmaq; **to ~ coffee with brandy** kofeyə konyak qatmaq
**lacerate** [.læsə'reɪt] *v* **1.** piltə-piltə etmək/olmaq; **2.** xətrinə dəymək, xəncər olub ürəyinə batmaq; *Your cruel words lacerated his feelings Sənin/ Sizin acı sözlərin/sözləriniz onu bərk incitdi/xəncər olub onun ürəyinə batdı*
**lacerated** [.læsə'reɪtɪd] *adj* **1.** piltə-piltə edilmiş; **2.** xətrinə dəymiş, ürəyinə toxunmuş
**laceration** [.læsə'reɪʃn] *n* **1.** piltələnmə, piltələmə; **2.** xətrinə dəymə, incitmə
**lack**[1] [læk] *n* çatışmamazlıq; **~ of *smth.*** bir şeyin çatışmamazlığı; **~ of money** pulun çatışmazlığı; *Lack of money forced him to return home Pul çatışmamazlığı onu evə qayıtmağa vadar etdi; There is no lack of money in their family Onların ailəsində pul çatışmamazlığı yoxdur; I am getting fat from lack of exercise Hərəkətsizlik ucbatından mən kökəlirəm; He's bored for lack of company Tənhalıqdan o, cana doymuşdu/gəlmişdi*
**lack**[2] [læk] *v* çatmamaq, çatışmamaq; *We lacked time to finish work İşi qurtarmağa vaxtımız çatmadı; He lacked the will power to give up smoking Onun papirosu tərgitməyə iradəsi çatmadı; He lacks experience Onun təcrübəsi çatışmır; What is still lacking? Daha nə çatmır?*
**lackadaisical** [.lækə'deɪzɪkl] *adj* süst, ölgün, laqeyd; **a ~ approach to *one's* studies** təhsilinə laqeyd yanaşma
**lackey**[1] ['lækɪ] *n (pl* **lackeys***)* lakey, nökər
**lackey**[2] ['lækɪ] *v* lakeyçilik/nökərçilik etmək
**lackluster** ['læklʌstə^r] *adj* tutqun; bulanıq; **~ eyes** bulanıq gözlər
**laconic** [lə'kɒnɪk] *adj* lakonik, az sözlə ifadə edilən; **a ~ answer/speech/style** lakonik cavab /nitq/ üslub
**laconically** [lə'kɒnɪkəlɪ] *adv* lakonik şəkildə; qısaca, qısa olaraq; *He answered the question laconically O, suala qısaca cavab verdi*
**laconism** ['lækənɪzm] *n* lakoniklik, qısalıq, yığcamlıq

**lacquer**[1] ['lækə^r] *n* **1.** lak; **2.** bitkilərdən alınmış təbii rəng
**lacquer**[2] ['lækə^r] *v* lak çəkmək, laklamaq; **to ~ *one's* nails** dırnaqlarına lak çəkmək, dırnaqlarını laklamaq
**lactic** ['læktɪk] *adj* zərdab *(südün çürüməsi nəticəsində əmələ gəlmiş turş göy rəngli su/ maye)*
**lactose** ['læktouz] *n* laktoza *(südün içərisində olan şəkər növü)*
**lacuna** [lə'kju:nə] *n (pl* **-nae** *və ya* **lacunas***)* boşluq, boş yer, ara *(mətn daxilində)*; **a ~ in the manuscript** əlyazmada boş/buraxılmış yer
**lacy** ['leɪsɪ] *adj* krujevalı, krujevayabənzər, tor
**lad** [læd] *n* oğlan; *He is a good lad O, yaxşı oğlandır; He was only a young lad when the war began Müharibə başlayanda o, cavan bir oğlan idi; He is a great lad O çox istəkli oğlandır; Come on, lads, let's go Uşaqlar, gəlin gedək;*
◊ **to climb up the ~** karyera qazanmaq; **to mount a ~** dar ağacından asılmaq
**ladder**[1] ['lædə^r] *n* nərdivan, pilləkən; **folding ~** qatlama nərdivan
**ladder**[2] ['lædə^r] *v* **1.** nərdivanla təmin etmək; **2.** pillə-pillə addımlamaq, pillə-pillə irəli apar-maq/ getmək
**laden** ['leɪdn] *adj* yükdaşıyan; yüklü; dolu; *The tree is ladened with fruit Ağacın meyvədən az qala budaqları yerə dəyir*; **dishes ~ with fruit** meyvə ilə ağzına qədər dolu boşqablar; **a heart ~ with sorrow** qəmlə/kədərlə dolu ürək
**lading** ['leɪdɪŋ] *n* yük; **bill of ~** yüklənməli olan əşyaların siyahısı
**ladle**[1] ['leɪdl] *n* çömçə
**ladle**[2] ['leɪdl] *v* çömçə ilə tökmək/götürmək; *She ladled out the soup into bowls O, çömçə ilə şorbanı/supu kasalara tökdü*
**lady**[1] ['leɪdɪ] *n* **1.** qadın, xanım; **2.** yüksək mənsəb sahibinin arvadı
**lady**[2] ['leɪdɪ] *adj* qadın, qadın cinsindən olan; **a ~ barber** qadın dəllək; **a ~ doctor** qadın həkim
**ladybird** ['leɪdɪbə:d] *n* parabüzən, xanımböcəyi *(həşərat)*
**ladybug** ['leɪdɪbʌg] *n* = **ladybird**
**lady-in-waiting** [.leɪdɪɪn'weɪtɪŋ] *n* kraliçanın/ şahzadənin qulluğunda duran qadın
**ladylike** ['leɪdɪlaɪk] *adj* qadınsayağı, qadın kimi, qadınaoxşar; **~ behaviour** qadınsayağı davranış
**ladyship** ['leɪdɪʃɪp] *n* xanımlıq, xanım-xatınlıq
**lag** [læg] *v* I *(-gg-) (həm də* **to ~ behind***)* arxada qalmaq, dəstədən geri qalmaq; *The children lagged behind Uşaqlar arxada qaldılar; He lags behind the rest of his class O, sinifdə digər uşaqlardan geri qalır*
**lag** [læg] *v* II borunu istilik örtüyü ilə örtmək
**lager beer** ['la:gə'bɪə^r] *n* yüngül pivə
**laggard**[1] ['lægəd] *n* ləng tərpənən/astagəl adam
**laggard**[2] ['lægəd] *adj* ləng, astagəl, asta tərpənən
**lagging** ['lægɪŋ] *n* geridə/dalda/arxada qalma, ləngimə



**lagoon** [lə'gu:n] *n* dayaz göl/gölməçə
**laid** [leɪd] **to lay** *felinin pt forması*
**lain** [leɪn] **to lie** II *felinin pp forması*
**lair** [leə^r] *n* **1.** mağara, vəhşi heyvanların məskunlaşdığı yer; **2.** adamın gizləndiyi/çəkildiyi yer; *In a family argument he just retreats to his lair in the study Ailədə mübahisə yarananda o, dərhal öz kabinetinə çəkilir*
**lake** [leɪk] *n* göl; **Lake Victoria** Viktoriya gölü
**lakeside** ['leɪksaɪd] *n* göl kənarı/qırağı
**lama** [la:mə] *n* Tibetdə və ya Monqolustanda buddist keşiş
**lamasery** [.la:mə'zerɪ] *n* lamaların monastrı
**lamb**[1] [læm] *n* **1.** quzu; **2.** quzu əti; **3.** quzu dərisi; **4.** məsum/günahsız/dinc adam
**lamb**[2] [læm] *v* doğmaq, balalamaq, quzulamaq *(qoyun)*
**lambent** ['læmbənt] *adj* **1.** parlayan, parlaq, işıqsaçan, işıqverən *(səma, ulduz, göz haq.)*; **~ eyes** parlayan gözlər; **2.** parlaq, çox yaxşı/gözəl *(ağıl, üslub haq.)*
**lambkin** ['læmkɪn] *n* balaca quzu, quzucuq
**lambskin** ['læmskɪn] *n* **1.** quzu dərisi; **2.** papaqlıq quzu dərisi
**lame**[1] [leɪm] *adj* **1.** axsaq, topal; şikəst; **a ~ man** axsaq/topal adam; *He's lame in the left leg O, sol ayağından şikəstdir; The horse went lame At axsaq/topal oldu;* **2.** *məc.*: **a ~ argument** qeyri-inandırıcı arqument; **a ~ excuse** qeyri-səmimi üzrxahlıq
**lame**[2] [leɪm] *v* şikəst etmək; *He was lamed during the war O, müharibədə şikəst oldu*
**lamy** [la:'meɪ] *n* zərxara *(parça)*; **a ~ evening gown** zərxaradan tikilmiş axşam xalatı
**lame duck** ['leɪmdʌk] *n seçki müddəti qurtardıqdan sonra yenidən seçilmədən işləyən məmur*
**lament** [lə'ment] *v* məyus olmaq; kədərlənmək; yas saxlamaq; məyus etmək, kədərləndirmək; **to ~ over *smth.*** nədənsə şikayətlənmək; **to ~ over *one's* dead wife** ölmüş arvadı üçün kədərlənmək/ qüssələnmək; *They were lamenting over their misfortunes Onlar öz müsibətlərindən şikayətlənirdilər*
**lamentable** ['læməntəbl] *adj* yazıq, miskin; bərbad; *The house was in a lamentable state Ev bərbad vəziyyətdə idi*
**laminated** ['læmɪneɪtɪd] *adj* qat-qat; lay-lay; **~ glass** qat-qat/lay-lay şüşə; **~ wood** faner
**lamp** ['læmp] *n* lampa; fənər
**lamplight** ['læmplaɪt] *n* lampa işığı; **in the ~** lampa işığında; *Her face was pale in the lamplight Lampa işığında onun sifəti solğun idi*
**lampoon**[1] [læm'pu:n] *n* pamflet
**lampoon**[2] ['læmpu:n] *v* tənqid/ifşa etmək; *He was viciously lampooned in the newspaper Onu qəzetdə ifşa etdilər*
**lampoonist** ['læmpu:nɪst] *n* pamflet yazan
**lamppost** ['læmppoust] *n* işıq dirəyi

**lampshade** ['læmpʃeɪd] *n* abajur *(lampa qalpağı)*
**lance**[1] [læns] *n* **1.** nizə; **2.** nizə kimi batan alət/şey
**lance**[2] [læns] *v* **1.** nizə batırmaq; **2.** lansetlə kəsib atmaq
**lance-corporal** ['læns.kɔ:pərəl] *n* kiçik kapral
**lancer** ['lænsə^r] *n* nizə ilə silahlanmış saray əsgəri
**lancet** ['lænsɪt] *n* lanset; cərrah bıçağı
**land**[1] [lænd] *n* I torpaq; quru; *I am glad to be on the dry land again Mən çox şadam ki, yenidən qurudayam*; **to travel by ~** quru ilə səyahət etmək; **to sight ~** quru/torpaq/sahil görmək; **to reach the ~** sahilə çatmaq
**land** [lænd] *n* II **1.** torpaq, əkin; **rich ~** məhsuldar/ bərəkətli torpaq; **arable ~** əkinçilik üçün yararlı torpaq/sahə; **to work on the ~** torpaqda işləmək; **2.** yer, ərazi; **forest ~** meşəlik yer/ərazi; *The road lay over marsh land Yol bataqlıq yerdən keçirdi*; **arid ~s** quraq yerlər/ərazilər; **the steppe ~s of the south** cənubun quraq səhraları; **3.** torpaq mülkiyyəti; **4.** ölkə, vətən; **the customs of different countries** müxtəlif ölkələrin adətləri; **native ~** doğma vətən;
◊ *He is no longer in the land of the living O artıq sağ deyil*
**land**[2] [lænd] *adj* sahil, quru; **a ~ breeze** sahil küləyi; **~ forces** *hərb.* quru qoşunları
**land**[3] [lænd] *v* **1.** məskunlaşmaq, məskunlaşdırmaq; **2.** düşmək *(qatardan və s.)*; *The passengers were landed at Baki Sərnişinlər Bakıda düşdülər;* **3.** boşaltmaq; *The timber has been landed at the shore Taxta materiallar sahilə boşaldılıb;* **4.** endirmək, oturtmaq *(yerə)*; *He landed the plane safely O, təyyarəni sağ-salamat yerə endirdi; He landed the helicopter on the lawn O, vertolyotu çəmənliyə endirdi/oturtdu;* **5.** tutmaq *(balıq)*; *We landed an enormous pike Biz çox nəhəng bir durnabalığı tutduq;* **6.** *məc.* əldə etmək; *He landed a good job O, yaxşı iş yeri əldə etdi; She always lands the leading role O həmişə baş rolda çıxış edir;* **7.** düşmək, enmək *(təyyarədən, gəmidən)*; *I landed at London Mən Londonda gəmidən düşdüm; The delegation landed at the port/airport at noon Nümayəndə heyəti dəniz limanına/ təyyarə meydanına günorta vaxtı düşdü/endi;* **8.** oturmaq, qonmaq *(raket, quş və s. haq.)*; *The rocket landed on the Moon Raket Aya oturdu/düşdü; The bird landed on the roof Quş dama qondu/oturdu;*
◊ *You've landed me in a nice mess! Məni çox baməzə bir işə salmısan! I always get landed with the heavy jobs Mənə həmişə işin çətinini tapşırırlar! Are we really going to be landed again with the whole family? Yenə də bütün ailənin ağırlığı bizim üzərimizə düşəcəkmi? Those goings on will land you in jail Bu cür gedişat səni/sizi axırı həbsxanaya salacaq*
**landing**[1] ['lændɪŋ] *n* **1.** sahilə çıxma/çıxartma; **2.** *hərb.* desant çıxartma; **3.** körpü *(gəmilərin yan-*

*alması üçün)*; 4. yerə enmə/oturma *(təyyarə)*; **emergency/forced** ~ məcburi enmə/oturma *(kosmik gəmi)*; 5. pilləkən meydançası; *I left my case on the landing Mən çamadanımı pilləkənin meydançasında qoydum*

**landing**[2] ['lændɪŋ] *adj*: ~ **distance** *av.* enmə məsafəsi; ~ **operation** *hərb.* desant çıxarma əməliyyatı; ~ **boat** desant çıxarma kateri/gəmisi; ~ **ship** desant gəmisi; ~ **mark** *av.* yerə enmə işarəsi

**landing ground** ['lændɪŋ graund] *n av.* enmə və qalxma meydançası

**landing-net** ['lændɪŋnet] *n* balıq toru

**landing party** ['lændɪŋ,pa:tɪ] *n hərb.* desant, desant dəstəsi/bölməsi

**landing-stage** ['lændɪŋsteɪdʒ] *n* körpü *(gəmilərin yan alması üçün)*

**landing-strip** ['lændɪŋstrɪp] *n av.* enmə və qalxma zolağı

**landing troops** ['lændɪŋtru:ps] *n hərb.* desant qoşunu/ordusu

**landlady** ['lændleɪdɪ] *n* 1. torpaq sahibəsi; 2. *pl* ev/mehmanxana sahibəsi; *The entire street is owned by one landlady Bu küçədəki bütün evlər yalnız bir xanıma məxsusdur; The landlady was serving behind the bar Sahibə barın arxasında işləyirdi/xidmət göstərirdi*

**land-locked** [,lænd'lɔkt] *adj* 1. hər tərəfdən torpaqla əhatə edilmiş körfəz/ölkə; 2. suyun içində ada

**landlord** ['lænd'lɔ:d] *n* 1. mülkədar; 2. mülk/torpaq /yer sahibi

**landmark** ['lændma:k] *n* 1. nişangah; sərhəd; *The tower was a landmark for travellers Qüllə səyahətçilər üçün nişangah idi; This hill is a landmark for miles around Bu təpə hər tərəfdən görünür*; 2. *məc.*: ~s dünya tarixində baş vermiş böyük hadisələr; 3. bir şeyin inkişafının ən mühüm mərhələsi; *The invention of the microscope is a landmark in science Mikroskopun kəşfi elmdə böyük hadisədir*; 4. torpağın sərhədlərini bildirən nişangahlar *(dirək, ağac və s.)*

**landowner** ['lændounəʳ] *n* mülkədar, torpaq sahibi

**landscape** ['lændskeɪp] *n coğ.* landşaft, mənzərəli yer, peyzaj; **a flat** ~ düzən mənzərə; **a mountainous** ~ dağ mənzərəsi; **to admire the** ~ mənzərədən zövq almaq, mənzərəyə məftun olmaq

**landslide** ['lændslaɪd] *n* 1. torpaq sürüşməsi, uçqun; 2. *məc.* gücsüzlük; *The election proved a landslide for the left Seçkilər solların gücsüzlüyünü üzə çıxartdı*

**landsman** ['lændzmən] *n* 1. dənizçi olmayan/ quruda yaşayan adam; 2. həmvətənli, eyni ölkədən olan adam

**landward** ['lændwəd] *adj* üzü quruya baxan, torpağa doğru, üzü quruya

**landwards** ['lændwədz] *adv* üzü torpağa/quruya, torpağa/quruya doğru

**lane** [leɪn] *n* 1. cığır; 2. döngə; 3. dəhliz *(gəmilərin keçdiyi)*; 4. küçədə xətlə ayrılmış zolaq; 5. yarışın keçirildiyi marşrut

**language** ['læŋgwɪdʒ] *n* dil; **native** ~ ana dili, doğma dil; **foreign** ~ xarici/əcnəbi dil; **to learn a foreign** ~ əcnəbi/xarici dil öyrənmək; *He speaks several languages O, bir neçə dildə danışır; They were speaking their native language Onlar öz doğma dillərində danışırdılar*; **to speak the same** ~ eyni dildə danışmaq; **finger** ~ lal və karların dili; **strong** ~ andla dolu olan danışıq; **bad** ~ söyüş, təhqir

**languid** ['læŋgwɪd] *adj* süst, halsız, cansız, enerjisiz *(adam haq.)*

**languish** ['læŋgwɪʃ] *v* 1. süst/halsız olmaq; 2. əziyyət çəkmək; **to** ~ **in poverty** kasıbçılıqdan əziyyət çəkmək; 3. məyusluğa/ümidsizliyə qapılmaq

**languor** ['læŋgəʳ] *n* 1. bədən zəifliyi, halsızlıq, süstlük, ruh düşkünlüyü, məyusluq; 2. incə/ kövrək əhvali-ruhiyyə

**lanquor** ['læŋkuəʳ] *n zool.* uzunquyruq meymun

**lank** [læŋk] *adj* 1. arıq *(adam haq.)*; 2. düz və hamar *(saç haq.)*

**lanky** ['læŋkɪ] *adj* arıq; bir dəri, bir sümük; ələngə *(qolu və qıçı arıq və uzun olan adam haq.)*

**lantern** ['læntən] *n* fənər *(küləkdən qoruyucu şüşəsi olan)*

**lanyard** ['lænjəd] *n* 1. qın *(bıçaq saxlamaq üçün dənizçi və əsgərlərin gəzdirdikləri)*; 2. gödək ip *(gəmidə)*

**lap**[1] [læp] *n* I qucaq, ağuş, qoyun, dizin üstü; **in the** ~ **of nature** təbiətin qoynunda/ağuşunda; *The mother had the baby on her lap Uşaq ananın dizi üstündə idi;*

◊ **to live in the** ~ **of luxury** cah-calal/dəbdəbə içində yaşamaq

**lap** [læp] *n* II *id.* dairə *(qaçış zolağı)*; dövrə; *The cyclist fell half way round in the second lap İkinci dövrənin ortasında velosipedçi yıxıldı; They are on the last lap Onlar axırıncı dövrədədirlər*

**lap**[2] [læp] *v* I 1. bükmək, bələmək; 2. üstünü örtmək; 3. *məc.* həqiqət kimi qəbul etmək; *He'll lap up any compliment O, hər bir tərifi həqiqət kimi qəbul edəcək*

**lap** [læp] *v* (-pp-) II 1. loqquldatmaq, loqqultu ilə içmək; *The cat quickly lapped up all the milk Pişik bir anda bütün südü içdi/loqquldatdı*; 2. *d.d.* qapıb götürmək; 3. qurtuldada-qurtuldada içmək; 4. şappıldatmaq; şappıldamaq

**lapdog** ['læpdɔg] *n* kiçik qucaq iti

**lapel** [lə'pel] *n* yaxa

**lapidary**[1] ['læpɪdərɪ] *n* qiymətli daşları təraş edən usta

**lapidary**[2] ['læpɪdərɪ] *adj* 1. təraş; ~ **machine** təraş dəzgahı; 2. *məc.* təmiz; dəqiq; səlis; qısa və aydın; **a** ~ **speech** səlis/aydın nitq; ~ **style** səlis üslub

**lapse**[1] [læps] *n* 1. xəta, yanılma, yanlışlıq; *Apart from the lapse her work is good Bir sıra xətalara baxmayaraq onun işi yaxşıdır*; 2. pisləşmə, korlanma; **a** ~ **of memory** yaddaşın pisləşməsi; 3. zaman kəsiyi; bir müddət; **after a long** ~ **of time** uzun bir müddətdən sonra; **after a** ~ **of two months** iki aylıq müddətdən sonra



**lapse**[2] [læps] *v* 1. dönmək, yolundan dönmək, qayıtmaq; **to** ~ **from the path of virtue** haqq yolundan dönmək; *He often lapses into his native tongue O tez-tez doğma dilinə qayıdır/müraciət edir; He lapsed into silence O, sakit oldu/susdu*; 2. müddəti başa çatmaq; *The term has lapsed Müddət başa çatıb; My driving licence has lapsed Mənim sürücülük vəsiqəmin müddəti başa çatıb*

**lapwing** ['læpwɪŋ] *n* çökükburun *(quş)*

**larceny** ['la:sənɪ] *n (pl* **-ies**) *hüq.* oğurluq

**larch** [la:tʃ] *n bot.* qara şam *(ağac)*

**lard** [la:d] *n* ərinmiş donuz yağı; **to fry in** ~ əridilmiş donuz yağında qızartmaq

**larder** ['la:dəʳ] *n* ərzaq anbarı

**large**[1] [la:dʒ] *n*: **at** ~ 1) azadlıqda; *He'll soon be at large O tezliklə azadlıqda olacaq*; 2) ətraflı, təfərrüatlı, hərtərəfli; **to go into the question at** ~ məsələyə hərtərəfli/ətraflı yanaşmaq, məsələnin təfərrüatına varmaq; **to talk at** ~ ətraflı/təfərrüatı ilə danışmaq; 3) məqsədsiz, sərbəst; 4) *amer.* tam səlahiyyətli/səlahiyyəti olan; **ambassador at** ~ xüsusi tapşırıqlar üzrə tam səlahiyyətli səfir; **promises made at** ~ geninə-boluna verilən vədlər

**large**[2] [la:dʒ] *adj* 1. geniş, böyük, iri, yekə; **a** ~ **house** geniş/böyük ev; *He lost a large sum at cards O, qumarda böyük məbləğdə pul uduzdu*; **a** ~ **firm** böyük firma; ~ **eyes** iri gözlər; ~ **mouth** yekə ağız; *A large majority of the children can't swim Uşaqların böyük əksəriyyəti üzə bilmir; There was a large audience in the concert Konsertdə çox adam var idi*; 2. nəhəng, yekəpər; **a** ~ **woman** nəhəng/ yekəpər qadın; *These shoes are on the large side Bu ayaqqabılar çox böyükdür*

**largely** ['la:dʒlɪ] *adv* geniş miqyaslı/şəkildə, başlıca olaraq, əsasən; *His success was largely due to luck Uğur qazanmaqda ona əsasən tanrı kömək olmuşdur; It's largely a question of concentration Bu əsasən diqqət məsələsidir; He himself was largely to blame Əsasən o özü günahkar idi*

**large-scale** ['la:dʒskeɪl] *adj* genişmiqyaslı; **a** ~ **map** genişmiqyaslı xəritə; ~ **reforms/ operations** genişmiqyaslı islahatlar/əməliyyatlar

**lariat** ['lærɪət] *n* 1. at bağlamaq üçün kəndir/sicim; 2. kəmənd

**lark**[1] [la:k] *n* I torağay; **to rise with the** ~ *məc.* işıqlaşanda/xoruz banında durmaq *(yataqdan)*

**lark** [la:k] *n* II dəcəllik, zarafat, əyləncə; **for a** ~ zarafatla, zarafatyana

**lark**[2] [la:k] *v* 1. zarafat etmək, əylənmək, məzələnmək; 2. maneəni dəf etmək *(atla)*

**larkspur** ['la:kspə:ʳ] *n bot.* mahmızçiçəyi

**larva** ['la:və] *n zool.* sürfə *(həşəratlarda)*

**laryngitis** [,lærɪn'dʒaɪtɪs] *n tib.* laringit

**larynx** ['lærɪnks] *n* udlaq, qırtlaq

**lash**[1] [læʃ] *n* 1. qamçı, şallaq; 2. qamçı ilə/şallaqla vurulan zərbə; 3. kirpik

**lash**[2] [læʃ] *v* 1. döyəcləmək; *The rain was lashing (against) the window Yağış pəncərəni döyəcləyirdi;* 2. çatdırmaq, gətirib çıxartmaq, vəziyyətə salmaq; *The speaker lashed his listeners into a fury Natiq öz dinləyicilərini dəhşətə saldı*; **to** ~ **out against/at** ***smb./smth.*** bir kəsə/şeyə qarşı kəskin hücuma keçmək *(söz və ya zərbə ilə)*; *The horse lashed out at me At mənə təpik atdı; The speaker lashed out against the government Spiker hökumətə qarşı hücuma keçdi*; 3. bərkitmək, möhkəmlətmək

**lashing** ['læʃɪŋ] *n* 1. ip, kəndir; 2. qamçılama, döymə, vurma

**lass** [læs] *n d.d.* 1. qız; 2. *şair.* sevgili, canan

**lassie** ['læsɪ] *n* = **lass**

**lassitude** ['læsɪtju:d] *n* yorğunluq, üzgünlük

**lasso** ['læsou] *n (pl* ~**s**, ~**es** [-su:z] uzun kəndir, sicim

**last**[1] [la:st] *n* I son, axır; **at long** ~ əvvəl-axır; **to/till the** ~ sona qədər;

◊ **at** ~ nəhayətdə; **to the** ~, **till the** ~ axıra/ sona qədər; **to fight to the** ~ sona/axıra qədər vuruşmaq; **to breathe** ***one's*** ~ ölmək, rəhmətə getmək; ***We'll never hear the last of it*** ≅ *Bu işin sonu/axırı yoxdur*

**last** [la:st] *n* II ayaqqabı qəlibi

**last**[2] [la:st] *adj* 1. axırıncı, sonuncu; *It is our last hope Bu bizim axırıncı/sonuncu ümidimizdir*; **the** ~ **house in the street** küçədəki axırıncı ev; **the** ~ **house but two** axırdan üçüncü ev; *He is the last person I want to see O mənim görmək istədiyim axırıncı adamdır*; 2. əvvəlki, qabaqkı, keçmiş; ~ **week/month/year** keçən həftə/ay/il; *He left last Tuesday O, keçən çərşənbə axşamı getdi; Last winter I broke my leg Keçən qış mən qıçımı sındırdım*; 3. axırıncı dəfə; *When did you see him for the last time? Sən/Siz onu axırıncı dəfə haçan gördün?/gördünüz? The last time I saw him he was looking ill Mən onu axırıncı dəfə görəndə o, xəstə görünürdü*

**last**[3] [la:st] *v* 1. davam etmək; *The war lasted five years Müharibə beş il davam etdi; The play lasts two hours Tamaşa iki saat davam edir*; 2. davam gətirmək, sağ qalmaq, ölməmək; *He is not expected to last till morning O, səhərə sağ çıxmaz; His secretaries usually last a couple of weeks Onun katibləri adətən bir neçə həftə davam gətirirlər*; 3. çatmaq; yetmək, kifayət etmək; *Will our petrol last? Bizim benzinimiz çatacaqmı? A packet of cigarettes never lasts me long Bir qutu siqaret heç vaxt mənə kifayət etmir; Their money only lasted a week Onların pulu yalnız bir həftəyə kifayət etdi/ çatdı*

**last**[4] [la:st] *adv* **1.** axırıncı, sonuncu; *He spoke last O, sonuncu/axırıncı danışdı; He came in last O içəri axırıncı girdi;* **2.** axırıncı dəfə; *When did you last hear him play? Sən/Siz onun axırıncı dəfə oynadığını nə vaxt görmüsən/görmüsünüz? I last had a letter from him two years ago Mən ondan axırıncı dəfə iki il bundan qabaq məktub almışam*

**lasting** [ˈla:stɪŋ] *adj* davamlı, bərk, möhkəm; **a ~ peace** möhkəm/davamlı sülh; *The illness caused no damage Xəstəlik ağır fəsadlara səbəb olmadı*

**lastly** [ˈla:stlɪ] *adv* nəhayət, son nəticədə; *Lastly let me remind you Nəhayət, qoy/qoyun sənə/sizə xatırladım*

**latch**[1] [lætʃ] *n* cəftə, siyirmə, rəzə

**latch**[2] [lætʃ] *v* **1.** qıfıllamaq, kilidləmək; **2.** qıfıllanmaq, kilidlənmək; *All the doors latch securely Bütün qapılar etibarlı şəkildə qıfıllanır/ kilidlənir;* **3.** *d.d.* sataşmaq; *He latched on to me O mənə sataşdı;* **4.** yapışmaq; *He soon latched on to the fact that... Tezliklə o bu faktdan yapışdı ki,...*

**latchkey** [ˈlætʃkɪ] *n* giriş qapısının açarı; *I've lost the latchkey Mən giriş qapısının açarını itirmişəm*

**late**[1] [leɪt] *adj* **(later, latest, last, latter) 1.** gec, gecikmiş; **a ~ harvest** gecikmiş məhsul; **at this ~ hour** belə gec saatda/vaxtda; *Let's have a late meal Gəl/Gəlin yeməyi bir qədər gec yeyək; He made a late entry O çox gec gəlib çıxdı;* **2.** axır; **in ~ autumn** payızın axırlarında; **in the ~ Middle Ages** orta əsrlərin axırlarında; **in the ~ nineteenth century** on doqquzuncu əsrin axırlarında; *Come in the late morning/afternoon Səhərdən/Günortadan keçmiş gəl/gəlin;* **3.** əvvəlki, qabaqkı, ötən, keçmiş; **the ~ president** keçmiş prezident; **the ~ government** keçmiş/əvvəlki hökumət; **4.** rəhmətlik; rəhmətə getmiş, vəfat etmiş; **to be ~** gecikmək; **to be a bit ~** bir balaca /bir az gecikmək; *He was late for the train O, qatara gecikdi; We were late for the theatre Biz teatra gecikdik; I was half an hour late for dinner/for the lecture Mən günorta yeməyinə/ mühazirəyə yarım saat gecikdim; The train was an hour late Qatar bir saat gecikdi;* **of ~** son vaxtlar; *It's too late to change your mind Fikrini/ Fikrinizi dəyişmək artıq çox gecdir*

**late**[2] [leɪt] *adv* gec, xeyli keçmiş; *He worked late into the night O, gecədən xeyli keçmişə qədər işlədi; We always sit up late Biz həmişə gecədən keçmişə qədər otururuq;* **as ~ as 1900** hələ 1900-cü ildə; **~ last year** keçən ilin sonlarına yaxın;

◊ *Better late than never Heç olmamaqdansa, gec olmağı yaxşıdır*

**latecomer** [ˈleɪtkʌməʳ] *n* gec gələn/gecikən adam

**lately** [ˈleɪtlɪ] *adv* son vaxtlar, bu yaxınlarda; *Have you seen him lately? Sən/Siz onu son vaxtlar görmüsənmi/ görmüsünüzmü? I've seen him quite lately Mən onu lap bu yaxınlarda görmüşəm; It's only lately that I have started painting Mən yalnız son vaxtlarda rəssamlıqla məşğul olmağa başlamışam*

**lateness** [ˈleɪtnɪs] *n* gecikmə, ləngimə; **the ~ of his arrival** onun gəlişinin ləngiməsi/gecikməsi; **owing to the ~ of the hour** vaxtın gec olmasına görə

**latent** [ˈleɪtənt] *adj* **1.** gizli, aşkarlanmamış; aşkar edilməmiş; **~ abilities** aşkar edilməmiş qabiliyyətlər; **2.** inkubasiya mərhələsi keçirən; **~ bacteria** inkubasiya mərhələsində olan bakteriya

**later**[1] [ˈleɪtəʳ] *adj* nisbətən sonrakı/gec; *In his later years he lived in the village O, ömrünün sonrakı illərini kənddə yaşadı*

**later**[2] [ˈleɪtəʳ] *adv* gec; **sooner or ~** gec-tez; **no ~ than 8 o'clock** saat səkkizdən gec olmayaraq; **not now, ~** indi yox, sonra; **~ on** sonralar, daha sonra; *A bit later on they saw him again Bir az sonralar onlar onu yenidən gördülər; I'll come later on Mən bir qədər sonra gələcəyəm*

**lateral** [ˈlætərəl] *adj* yan, kənar, böyür, qıraq

**latest** [ˈleɪtɪst] *adj* lap, son, axırıncı; ən son/axırıncı; **~ news** ən son xəbərlər

**lath** [læθ, la:θ] *n* (*pl* **laths** [læθz]) **1.** planka, reyka, tamasa, ensiz taxta; **2.** məhəccər, qəfəs;

◊ **(as) thin as ~** taxta kimi arıq

**lathe** [leɪθ] *n* çilingər dəzgahı

**lather**[1] [ˈlæðəʳ] *n* **1.** sabun köpüyü; **2.** tərdən əmələ gəlmiş köpük *(atda)*

**lather**[2] [ˈlæðəʳ] *v* köpükləndirmək; köpüklənmək; **to ~ *one's* face before shaving** qırxmamışdan qabaq üzünü sabunla köpükləndirmək; *Soap does not lather in sea-water Sabun dəniz suyunda köpüklənmir; The horse was badly lathered At tamam köpüyün içində idi*

**Latin**[1] [ˈlætɪn] *n* **1.** latın dili; **2.** latın mənşəli adam; *He's a typical latin O, tipik latındır*

**Latin**[2] [ˈlætɪn] *adj* latın; **a ~ scholar** latınşünas dilçi; latın dilini öyrənən dilçi alim

**Latin American** [ˌlætɪnəˈmerɪkən] *n* Latın Amerikalı

**latinist** [ˈlætɪnɪst] *n* latinist, latın dilinin tədqiqi ilə məşğul olan adam

**latitude** [ˈlætɪtju:d] *n* **1.** *coğ.* en dairəsi; **at a ~ of 30° North** şimal en dairəsinin 30-cu dərəcəsində; **high/low ~s** yuxarı/tropik en dairələri; **2.** *məc.* səlahiyyət, səlahiyyət dairəsi; *Our terms of reference give us very little latitude Bizim səlahiyyət dairəmiz çox məhduddur; We are allowed great latitude in choosing our subjects Bizə mövzu seçməkdə böyük səlahiyyət verilmişdir*

**latrine** [ləˈtri:n] *n* tualet quyusu *(kənd yerlərində)*

**latter** [ˈlætəʳ] *adj* **1.** axırıncı, sonuncu; **the ~ part of the book** kitabın sonuncu/axırıncı hissəsi; **in the ~ part of the week** həftənin sonunda; **in the ~ part of the year** ilin son aylarında; **2.** ikidən sonuncu; *Of these two men the former is dead, but the latter is still alive Bu iki kişidən birincisi ölmüş, amma ikincisi hələ də sağdır; Of sparrows and swallows, the former are native, the latter are migratory Sərçə və qaranquşlardan, birincilər qışda qalan, ikincilər köçəridirlər*



**latterly** [ˈlætəlɪ] *adv* sonuncu olaraq

**lattice**[1] [ˈlætɪs] *n* şəbəkə, dəmir hörgü

**lattice**[2] [ˈlætɪs] *adj* şəbəkəli; **a ~ frame/girder/pylon** dəmir və ya poladdan düzəldilmiş şəbəkəli çərçivə; **a ~ window** şəbəkəli pəncərə

**latticed** [ˈlætɪst] *adj* şəbəkələnmiş, şəbəkə vurulmuş

**Latvian**[1] [ˈlætvɪən] *n* **1.** latviyalı; **2.** latış dili

**Latvian**[2] [ˈlætvɪən] *adj* Latviya, Latviyaya aid olan, latış; **the ~ language** latış dili

**laud**[1] [lɔ:d] *n* tərif, mədh, alqış

**laud**[2] [lɔ:d] *v* tərifləmək, şöhrətləndirmək, mədh etmək

**laudable** [ˈlɔ:dəbl] *adj* tərifə/mədhə layiq, tərifli

**laudably** [ˈlɔ:dəblɪ] *adv* şan-şöhrətlə, təmtəraqla, təriflə, pəh-pəhlə

**laudanum** [ˈlɔ:dənəm] *n* tiryək *(istifadə üçün siqaretin içinə doldurulub hazırlanmış)*

**laudatory** [ˈlɔ:dətərɪ] *adj* tərif/mədh ifadə edən

**laugh**[1] [la:f] *n* gülüş; **a loud ~** şaqraq gülüş, qəhqəhə; **with a ~** gülüşlə, qəhqəhə ilə; *We had a good/hearty laugh over it Biz buna ürəkdən güldük*

**laugh**[2] [la:f] *v* gülmək; **to ~ at *smb.*** bir kəsə gülmək; *The speaker was laughed down Natiqin səsi qəhqəhə/ gülüş səsinin içində itib batdı; He laughed till he cried O, gözləri yaşarana qədər güldü; He made us laugh O bizi güldürdü; This is no time to laugh İndi gülmək vaxtı deyil; He looked serious, but I could see he was laughing O, ciddi görkəm almışdı, lakin mən hiss etdim ki, o, dodaqaltı gülürdü;*

◊ *We killed ourselves laughing Biz gülməkdən öldük; He laughs best who laughs last at söz Əsl gülən sonda gülləndir*

**laughable** [ˈla:fəbl] *adj* gülməli, gülünc; *It's just laughable Bu, sadəcə olaraq gülməlidir*

**laughing** [ˈla:fɪŋ] *adj* **1.** gülməli; *It's no laughing matter Bu, gülməli məsələ deyil;* **2.** gülən, gülümsəyən

**laughing stock** [ˈla:fɪŋˈstɔk] *n* gülüş mənbəyi

**laughter** [ˈla:ftəʳ] *n* gülüş; **~ provoking** gülüş doğuran; **roars of ~** ucadan gülüş/qəhqəhə; **amid general ~** ümumi gülüş sədaları altında;

◊ *He had the laughter on us O bizə güldü, O bizi masqaraya qoydu*

**launch**[1] [ˈlɔ:ntʃ] *n* kater *(motorlu və ya yelkənli kiçik gəmi)*; **pleasure ~** gəzinti kateri; **motor ~** motorlu kater

**launch**[2] [ˈlɔ:ntʃ] *v* **1.** buraxmaq; buraxılmaq; **to ~ a boat** suya qayıq buraxmaq; **to ~ a rocket** raket buraxmaq; **2.** *hərb.* əməliyyata/hücuma başlamaq; **to ~ an offensive** hücum başlamaq; **3.** başlamaq; **to ~ an election campaign** seçki kampaniyasına başlamaq; *He launched into a long explanation O, uzun-uzadı izahata başladı; I'd like to launch out into more independent work Mən istərdim ki, daha müstəqil işə başlayım*

**launching**[1] [ˈlɔ:ntʃɪŋ] *n* suya buraxma *(gəmi, qayıq və s. haq.)*; havaya buraxma *(raket, süni peyk və s.)*

**launching**[2] [ˈlɔ:ntʃɪŋ] *adj* buraxan, buraxılan; **a ~ pad** havaya/suya buraxmaq üçün tikilmiş qurğu

**launder** [ˈlɔ:ndəʳ] *v* yuyub ütüləmək, yuyulub ütülənmək; *The linen is beautifully laundered Dəyişək (alt paltarı) əla yuyulub ütülənib; This material launders badly Bu parça çox pis yuyulur*

**launderrete** [ˈlɔ:ndret] *n* paltaryuyan maşın, paltaryuyan mexaniki vasitələr

**laundry** [ˈlɔ:ndrɪ] *n* I camaşırxana, paltaryuyulan yer; *He sends his washing to the laundry O, paltarını camaşırxanada yuduzdurur*

**laundry** [ˈlɔ:ndrɪ] *n* II yataq dəsti, döşək ağı; **to do the ~** yorğan-döşək ağı yumaq

**laureate** [ˈlɔrɪət; ˈlɔ:rɪət] *n* laureat; **a Nobel ~** Nobel mükafatı laureatı

**laurel** [ˈlɔ:rəl] *n* dəfnə ağacı; **to look to *one's* ~s** şöhrətini qısqanclıqla qorumaq; **to rest on *one's* ~s** öz şöhrətinə güvənmək; **to win /to gain *one's* ~s** hörmət/şərəf qazanmaq

**laurelled** [ˈlɔ:rəld] *adj* başına dəfnə yarpaqlarından tac qoyulmuş

**lav** [læv] *n* **lavatory** *isminin qısa forması*

**lava** [ˈla:və] *n* lava *(vulkanın ağzından çıxan odlu maye)*

**lavatory** [ˈlævətərɪ] *n* ayaqyolu, tualet

**lave** [leɪv] *v şair.* yumaq, çimizdirmək

**lavender** [ˈlævəndəʳ] *n bot.* **1.** lavanda *(tünd-göy rəngli çiçəyi olan kəskin iyli yarımkol bitki)*; **2.** çimərkən suya qatılan ətirli maye *(lavanda)*

**lavish**[1] [ˈlævɪʃ] *adj* zəngin, gen-bol, təmtəraqlı, səxavətli, cah-calallı; *They gave us a lavish dinner Onlar bizə zəngin/təmtəraqlı nahar verdilər; She is lavish in her praise O, ağız dolusu tərif söyləməyi xoşlayır; He lives on a lavish scale O, gen-bol yaşayır, O, cah-calal içində yaşayır;* **~ furnishing** zəngin mebel

**lavish**[2] [ˈlævɪʃ] *v* səpmək *(pul)*, gen-bol xərcləmək; *She lavishes money/gifts on the children O, uşaqlara gen-bol pul paylayır/hədiyyələr verir*

**law**[1] [lɔ:] *n* **1.** qanun; **according to ~** qanuna əsasən/müvafiq olaraq; *It's against the law Bu, qanuna ziddir;* **to pass a ~** qanun qəbul etmək; **to break a /the ~** qanun/qanunu pozmaq; **to keep on the right side of the ~** qanunu pozmamaq; qanunun tələblərinə müvafiq olaraq hərəkət etmək; *The bill has become law Qanun layihəsi qanuna çevrilmişdir;* **2.** hüquq; **civil/international ~** mülki/beynəlxalq hüquq; **criminal ~** cinayət

hüququ; **to study** ~ hüquq elmini öyrənmək; *He has gone into the law O, hüquqşünas olub*; **doctor of** ~ hüquq elmləri doktoru; 3. hüquqi prosedura, məhkəmə; **to go to** ~ məhkəməyə müraciət etmək; **to take** *smb.* **to** ~ bir kəsi məhkəməyə vermək; 4. qanun, qayda; **the ~s of nature/ harmony** təbiətin / harmoniyanın qanunları

**law**[2] [lɔ:] *adj* hüquq; ~ **language** hüquq dili/ terminləri; ~ **school** hüquq məktəbi/fakültəsi; ~ **student** hüquq fakültəsinin tələbəsi

**law-abiding** [ˌlɔ:əˈbaɪdɪŋ] *adj* qanuna əməl/riayət edən; qanundan qorxan; *He is a good law-abiding citizen O, qanundan qorxan/qanuna əməl edən adamdır*

**law-breaker** [ˈlɔ:breɪkəʳ] *n* cinayətkar, qanunu pozan

**lawcourt** [ˈlɔ:kɔ:t] *n* məhkəmə

**lawful** [ˈlɔ:ful] *adj* qanuni, hüquqi

**lawless** [ˈlɔ:lɪs] *adj* qanunsuz, qeyri-qanuni

**lawn** [lɔ:n] *n* I göy otlaq, çəmənlik, qazon

**lawn** [lɔ:n] *n* II batist *(bezin nazik növü)*

**lawnmower** [ˈlɔ:nmouəʳ] *n* qazonbiçən maşın

**lawsuit** [ˈlɔ:sju:t] *n* məhkəmə prosesi/işi; *He brought a lawsuit against them O onların əleyhinə məhkəmə işi qaldırdı, O onları məhkəməyə verdi; They are involved in a lawsuit Onların işi məhkəmədədir*

**lawyer** [ˈlɔ:jəʳ] *n* vəkil; hüquqşünas; **company/ corporation** ~ hüquq məsləhətçisi *(müəssisədə)*

**lax** [læks] *adj* 1. pinti, səliqəsiz; 2. məsuliyyətsiz, qeyri-ciddi; *He is lax about his dress/work O öz geyimində/işində səliqəsizdir/pintidir; You're too lax with the children Sən/Siz uşaqlarla qeyri-ciddi davranırsan/davranırsınız, Sən/Siz uşaqları çox ərköyün öyrədirsən/öyrədirsiniz*; **a** ~ **teacher** qeyri-ciddi müəllim; *Standards nowadays are lax among the young Müasir dövrdə gənclər çox şeyə laqeyd münasibət bəsləyirlər*

**laxative** [ˈlæksətɪv] *n* işlətmə dərmanı

**laxity** [ˈlæksɪtɪ] *n* zəiflik, boşluq; qeyri-ciddilik; pintilik

**lay**[1] [leɪ] *n* I 1. torpaq örtük; qat *(torpaqda)*; 2. ölkənin çevrəsi və yerləşməsi

**lay** [leɪ] *n* II cinsi/seksual ünsiyyətdə tərəfdaş

**lay** [leɪ] *n* III 1. dini mahnı; ballada; 2. quşların mahnısı

**lay**[2] [leɪ] *adj* 1. dindar adama aid olmayan, qeyri-dini, qeyri-ilahi; **a** ~ **brother/sister** dini libas geyinən, lakin dini ayinləri yerinə yetirməyən qardaş/bacı; 2. qeyri-professional, dayaz, naşı; ~ **opinion** qeyri-professional/dayaz fikir

**lay**[3] [leɪ] *v (pt, pp* **laid***)* 1. qoymaq; açmaq; sərmək; döşəmək; çəkmək; **to** ~ **a carpet** xalça sərmək; **to** ~ **bricks** kərpic döşəmək; **to** ~ **a cable/pipes** kabel/boru çəkmək; **to** ~ **foundations** bünövrə qoymaq; **to** ~ **the table** stol açmaq; 2. *məc.* əlinə keçmək; *I can't lay hands on that book O kitab mənim əlimə keçmir; Don't dare to lay a finger on her Ona heç barmağının/barmağınızın ucu ilə də toxunmağa cəsarət etmə/etməyin*; 3. çökdürmək, yatırtmaq; *The rain will lay the dust Yağış tozu yatırdacaq; The heavy rain has laid the crops Güclü yağış taxılı yatızdırıb; The city was laid flat Şəhər yerlə yeksan edildi*; 4. *məc.* əsasını/bünövrəsini qoymaq; qoymaq, qurmaq; *We are laying the foundations of a new movement Biz yeni bir hərəkatın bünövrəsini /əsasını qoyuruq*; **to** ~ **a tax on** *smth.* bir şeyə vergi qoymaq; **to** ~ **the blame on** *smb.* **for** *smth.* bir şeyə/işə görə günahı bir kəsin boynuna qoymaq, bir şeyə görə günahı bir kəsin üstünə atmaq; **to** ~ **a trap for** *smb.* bir kəsə tələ qurmaq; bir kəsin ayağının altını qazımaq; 5. baş vermək, vaqe olmaq; *The scene is laid in London Hadisə Londonda vaqe olur/baş verir*; 6. yumurtlamaq, yumurta qoymaq; **to** ~ **eggs** yumurtlamaq; *The hens are laying well Toyuqlar yaxşı yumurtlayırlar*; **to** ~ **about** əlini yelləmək; *He laid about him with his fists O ona yumruğunu yellədi*; **to** ~ **aside** kənara /bir tərəfə qoymaq; *He laid his book aside O, kitabını bir tərəfə qoydu*; **to** ~ **aside money for** ***one's*** **old age** qocalığı üçün pul yığmaq/kənara pul qoymaq; **to** ~ **down** 1) yerə qoymaq; saxlamaq *(bir müddət)*; **to** ~ **a book down on the table** kitabı stolun üstünə qoymaq; **to** ~ **down** ***one's*** **life** həyatını həsr etmək; **to** ~ **a field down to grass** sahəyə ot səpmək; **to** ~ **down wine** şərabı illərlə saxlamaq; 2) *məc.* əsas götürmək, istinad etmək; *He likes to lay down the law O, qanuna istinad etməyi/əsaslanmağı xoşlayır; Follow the procedure laid down in the manual Təlimatda göstərilənlərə əməl et/edin*; **to** ~ **in** saxlamaq; **to** ~ **in stores for the winter** qışa ehtiyat saxlamaq; **to** ~ **into** üstünə atılmaq, üstünə yağdırmaq; **to** ~ **into** ***smb.*** bir kəsin üstünə atılmaq, bir kəsə hücum çəkmək; **to** ~ **low** *d.d.* yıxmaq, yorğan-döşəyə salmaq; *He was laid low with flu Zökəm onu yıxdı/yorğan-döşəyə saldı*; **to** ~ **off 1)** işdən çıxarılmaq/qovulmaq/çölə atılmaq; *A 100 workers were laid off Yüzlərlə fəhlə işdən qovuldu/çölə atıldı*; **2)** *d.d.* əl çəkmək, tərgitmək; *You must lay off the drink Sən/Siz spirtli içki içməyi tərgitməlisən/tərgitməlisiniz; Lay off! Bəsdir! Əl çək/çəkin!* **to** ~ **on** çəkmək, qoymaq; *She lays colours on her lips thickly O, dodaqlarına qalın boya çəkir*; **to** ~ ***one's*** **cards on the table** kartlarını açıb stolun üstünə qoymaq; **to** ~ **open** imkan yaratmaq; *He lays himself open to criticism O özü tənqidə imkan yaradır*; **to** ~ **out** açıb tökmək, sərmək, salmaq, yerə yıxmaq; *The gardens are well laid out Bağlar yaxşı salınıb*; **to** ~ **out a large sum on a scheme** layihənin həyata keçirilməsinə böyük məbləğdə pul qoymaq; **to** ~ **up** 1) saxlamaq, dayandırmaq; **to** ~ **up a ship/a car for the repairs** gəmini/maşını təmirə saxlamaq/dayandırmaq; 2) *məc.* yorğan-döşəyə düşmək; *He has laid up with measles O, qızılça xəstəliyindən yorğan-döşəyə düşüb*; **to** ~ **about** *d.d.* avara/veyl-veyl gəzmək, veyllənmək, avaralanmaq



**lay-by** [ˈleɪbaɪ] *n* dayanacaq *(yolun qırağında)*; *Let's pull in to the next lay-by Gəl/Gəlin növbəti dayanacaqda dayanaq*

**layer** [ˈleɪəʳ] *n* 1. qat, təbəqə; **a thin** ~ **of snow** nazik qar təbəqəsi; 2. yumurtlayan toyuq; *This hen is a good layer Bu toyuq yaxşı yumurtlayır*

**layette** [ˈleɪet] *n* yeni doğulmuş uşaq üçün dəyişək

**lay figure** [ˌleɪˈfɪgəʳ] *n* ağacdan yonulmuş insan fiquru

**layout** [ˈleɪaut] *n* planlaşdırma; tərtibat; ~ **of a building/park** binanın/parkın planlaşdırılması; *I like the layout of the dictionary Mən bu lüğətin tərtibatını xoşlayıram*; ~ **of an exhibition** sərginin tərtibatı

**lazar** [ˈlæzə] *n arx.* cüzamlı, cüzamla xəstələnmiş/ cüzama tutulmuş adam

**lazarus** [ˈlæzərəs] *n* 1. dilənçi/ kasıb adam; 2. cüzamlı xəstə/adam

**laze**[1] [leɪz] *n* tənbəllik, veyllik, avaraçılıq

**laze**[2] [leɪz] *v d.d.* veyllənmək, avaralanmaq, tənbəllik etmək; *I lazed in the sun all day Mən bütün günü günəşin altında veylləndim/ avaralandım*

**lazily** [ˈleɪzɪlɪ] *adv* 1. tənbəl, tənbəl-tənbəl, veyl, veyl-veyl; **to walk** ~ veyl-veyl gəzmək; 2. ağır, ağır-ağır, yavaş, yavaş-yavaş, asta, asta-asta

**laziness** [ˈleɪzɪnɪs] *n* 1. tənbəllik, veyllik; **out of** ~ tənbəllik ucbatından; 2. lənglik ağırlıq

**lazy** [ˈleɪzɪ] *adj* 1. tənbəl, veyl, avara; **to be** ~ tənbəl olmaq, tənbəllik etmək; *She is lazy about getting up O, yerindən durmağa tənbəllik edir*; 2. ağır, ağır tərpənən, astagəl, ləng, yavaş

**lazybones** [ˈleɪzɪbounz] *n d.d.* tənbəl adam

**lead**[1] [li:d] *n* I qurğuşun

**lead** [li:d] *n* II 1. *id.* birinci yer, ön cərgə; **to be in the ~/to take the** ~ birinci yerdə olmaq, liderlik etmək; *He is still in the lead O hələ də liderdir; He lost the lead O, liderliyi əldən verdi; It's your lead İndi sizin gedişinizdir*; **to play the** ~ *teatr.* baş rol oynamaq; 2. **to give a** ~ ***smb.*** bir kəsə nümunə göstərmək; *He gave them a lead O onlara nümunə göstərdi*; **to take the** ~ təşəbbüsü ələ almaq; *The police are following several leads Polis bir neçə istiqamətdə tədqiqat/axtarış aparır*; 3. xalta qayışı, cilov; *The dog was on a lead İt xaltalı idi; Put the dog on the lead İtin boynuna xalta sal/salın*; 4. *el.* naqil

**lead**[2] [li:d] *v* 1. idarə etmək; aparmaq; *He led us round the museum/through the forest O bizi muzeydə gəzdirdi/meşənin içərisi ilə apardı; She led the child by the hand O, uşağın əlindən tutub apardı*; 2. *məc.* **to be easily led** asanlıqla yoldan çıxarılmaq; *One thing leads the other İş bir-birinin ardınca gəlir; Such talks will lead us nowhere Belə söhbət bizi heç yerə çıxara bilməz, Belə danışıq bizə xeyir gətirməz/verməz*; 3. başçılıq etmək; *He led the expedition /the army O, ekspedisiyaya/orduya başçılıq etdi; He has led the party for 10 years O, on ildir ki, partiyaya rəhbərlik edib*; 4. birinci olmaq, qabaqlamaq; *They are leading us by 10 points Onlar 10 xal bizdən irəlidədirlər/irəlidə gedirlər*; 5. *id.* gətirib çıxarmaq; vadar/sövq etmək; **to** ~ ***smb.*** **to do** ***smth.*** bir kəsi bir iş görməyə vadar/ sövq etmək; *I've been led to believe that Məni vadar ediblər ki, ona inanım; The report led me to alter my decision Hesabat vadar etdi ki, mən qərarımı dəyişim*; 6. vaxt keçirmək, ömür sürmək; *He leads a quiet time O çox sakit vaxt keçirir; He seems he leads a double life Elə bil ki, o ikili həyat yaşayır*; 7. kart oyununda gediş etmək; **to** ~ **hearts** ürəkşəkilli kartlarla oyuna başlamaq; 8. *id.* irəlidə getmək; *The Azerbaijan boxer is leading in the fight Döyüşdə Azərbaycan boksçusu irəlidə gedir; That cyclist is leading by 20 metres O velosipedçi yarışda 20 metr irəlidə gedir*; 9. aparmaq; gedib çıxmaq; *Where does this road lead? Bu yol gedib hara çıxır/aparır?*; 10. *məc.* axırı/sonu olmaq; *It led to nothing Bunun axırı/sonu olmadı*; **to** ~ **away** uzaqlaşmaq; kənara çıxmaq; aralanmaq, ayrı düşmək; *We mustn't be led away from the point Biz öz məqsədimizdən/yolumuzdan kənara çıxmamalıyıq/ uzaqlaşmamalıyıq*; **to** ~ **back** geri qaytarmaq; aparmaq; *I led her back Mən onu geri qaytardım; This road leads back to the village Bu yol geriyə kəndə aparır*; **to** ~ **in/into** içərisinə/ içinə aparmaq; *This path leads into the garden Bu yol bağın içinə gedir/aparır*; **to** ~ **off** başlamaq, başlanmaq; *Who will lead off? Kim başlayacaq? The band led off with a waltz Orkestr valsla başladı*; **to** ~ **on** yola gətirmək; dilə tutmaq; yoldan çıxarmaq; *She will lead any man on O, istənilən kişini yoldan çıxara bilər*

**leader** [ˈli:dəʳ] *n* rəhbər; başçı; lider; **political ~s** siyasi rəhbərlər; **the ~s of the expedition** ekspedisiyanın rəhbərləri; **the** ~ **of the tribe** qəbilə başçısı; **the** ~ **of the gang** banda başçısı

**leadership** [ˈli:dəʃɪp] *n* rəhbərlik; başçılıq

**leading** [ˈli:dɪŋ] *adj* 1. görkəmli, aparıcı, əsas; **a** ~ **role** əsas rol; **a** ~ **politician** görkəmli/aparıcı siyasətçi; 2. *hüq.* baş; **a** ~ **counsel** baş vəkil; 3. *id.* aparıcı, öndə gedən; 4. gedən, aparan; **a** ~ **horse** irəlidə/öndə gedən at; **events** ~ **up to war** müharibəyə aparan hadisələr; **a way** ~ **to school** məktəbə aparan yol

**leaf** [li:f] *n* 1. *(pl* **-ves** [-vz]*)* *bot.* yarpaq; *The trees are in leaves Ağaclar yarpaqlayıb*; **as the leaves begin to fall...** yarpaqlar tökülməyə başlayanda...; 2. vərəq *(kitabda)*; **to turn over**

the leaves of a book kitabın vərəqlərini çevirmək; 3. təbəqə; **gold/silver** ~ qızıl/ gümüş təbəqə

**leafless** [ˈli:flɪs] *adj* 1. yarpaqsız; 2. vərəqsiz

**leaflet** [ˈli:flət] *n* 1. yarpaq; 2. səhifə; vərəqə *(çap edilmiş)*; 3. broşür

**leafy** [ˈli:fɪ] *adj* cavan yarpaqlı; yarpaq-yarpaq

**league** [li:g] *n* liqa; ittifaq; birlik; **the ~ of Nations** Millətlərin birliyi; **football** ~ futbol liqası; **in ~ with** ***smb.*** bir kəslə ittifaqda/birlikdə

**leak**[1] [li:k] *n* 1. axın *(qaz, su və s. haq.)*; *The boat has sprung a leak Qayıq deşik-deşikdir*; **to stop a** ~ axını dayandırmaq; *There is a leak of gas Buradan qaz axır/sızır*; 2. *məc.* məlumat sızması; **a security** ~ məxfi məlumatın sızması

**leak**[2] [li:k] *v* 1. buraxmaq; axıtmaq; *The drum is leaking oil Bak yağ/neft axıdır*; 2. *məc.* ağzından qaçırmaq; *Somebody has leaked the information Kimsə məlumatı ağzından qaçırıb*; 3. axmaq; dammaq, sızmaq; *The roof is leaking Damdan damır, Dam axıdır; Gas is leaking in the kitchen Mətbəxdə qaz sızır/axır*; 4. *məc.* sızmaq *(məlumat, sirr)*; *The news has leaked to the press Xəbər mətbuata sızıb*

**leakage** [ˈli:kɪdʒ] *n* yayılma, axma, sızma; buraxma *(qaz, su və s.)*; *The authorities are afraid of a leakage Müdriyyət xəbərin yayılmasından qorxur*

**leaky** [ˈli:kɪ] *adj* deşik-deşik, deşik-deşik olmuş, cırılmış; ~ **boots** deşik-deşik olmuş ayaqqabı; *The roof/boat is leaky Dam/Qayıq su buraxır*

**lean**[1] [li:n] *n* yağsız/yavan ət, arıq mal əti; *Would you like fat or lean? Sənə/Sizə yağlı, yoxsa yağsız ət lazımdır?*

**lean**[2] [li:n] *adj* 1. arıq, nazik; **a ~ horse/athlete** arıq at/idmançı; ~ **meat** arıq ət; **to grow** ~ arıqlamaq; 2. qeyri-məhsuldar; **a ~ year** qeyri-məhsuldar/ bərəkətsiz il; 3. dərsə pis davamiyyət; *It was a lean year academically Bu il dərsə davamiyyət pis oldu*

**lean**[3] [li:n] *v (pt, pp* **lent** *və ya* **leaned** [-d]) 1. söykəmək; *He lent the ladder against the wall O, nərdivanı divara söykədi; He lent his back against the wall O, kürəyini divara söykədi; Don't lean your elbows on the table Dirsəklərini/ Dirsəklərinizi stolun üstünə söykəmə/ söykəməyin*; 2. söykənmək; istinad etmək, əyilmək; *He lent (leaned) against the door O, qapıya söykəndi; He lent forward to speak to her O, qabağa əyildi ki, onunla danışsın; The post leans towards the right İşıq dirəyi sağ tərəfə əyilir; He was leaning on a stick O, çəliyə/əsaya söykənirdi; She leant over the sleeping child O, yatan uşağın üstünə əyildi; The trees are leaning over in the wind Ağaclar küləkdə əyilir; I lean towards the view that... Mən belə bir fikrə istinad edirəm ki,...*

**leaning** [ˈli:nɪŋ] *n* söykənmə, meyl, təmayül; *He has artistic leanings Onda artistliyə meyl var-dır; He has leanings towards journalism Onda jurnalistliyə meyl vardır*

**lean-to** [ˈli:ntə] *n* əlavə tikili; artırma

**leap**[1] [li:p] *n* sıçrayış; hoppanma; **in one** ~ bir sıçrayışla; *məc.* **a great ~ forward** irəliyə doğru iri/böyük bir sıçrayış; *It's a leap in the dark Bu, kor-koranə/riskli addımdır*

**leap**[2] [li:p] *v (pt, pp* **leapt** [lept] *və ya* **leaped** [-t]) hoppanmaq; tullanmaq; *He leapt the fence O, hasarın üstündən hoppandı; The children leapt for joy Uşaqlar sevincdən hoppanıb düşdülər; He leapt out of the window O, pəncərədən atıldı/ hoppandı; He leapt into the saddle O, yəhərə atıldı*;

◊ *Look before you leap Kor-koranə iş görmə ≅ Yüz ölç, bir biç*

**leap frog** [ˈli:p.frɔg] *n* ənzəli, eşşəkbeli sındırdı, atlanbac *(oyun)*

**leap year** [ˈli:p.jɪə^r] *n* uzun il *(fevral ayının 29 gündən ibarət olduğu)*

**learn** [ˈlə:n] *v (pt, pp* **learnt** *və ya* **learned)** 1. öyrənmək; təhsil almaq; yadda saxlamaq; əzbərləmək; *What do they learn at school? Onlar məktəbdə nə öyrənirlər? He has learned French from his mother O, fransız dilini anasından öyrənib; I've learnt my part Mən öz rolumu öyrənmişəm/ əzbərləmişəm*; **to ~ a trade** ticarəti öyrənmək; *I have learnt the news from my friend Mən xəbəri dostumdan öyrənmişəm; I learnt up all about the places we were going to visit Bizim səyahət edəcəyimiz yerlər barədə mən hər şeyi soruşub öyrəndim*; 2. öyrənmək, öyrəşmək; *He is learning to drive O, maşın sürməyi öyrənir; You must learn to be patient Sən/Siz səbirli olmağa öyrəşməlisən/öyrəşməlisiniz; We learn from our mistakes Biz səhvlərimizdən öyrənirik; We learned about it from the radio Biz bu haqda radiodan məlumat aldıq/öyrəndik*

**learned** [ˈlə:nd] *adj* alim; oxumuş, öyrənmiş

**learner** [ˈlə:nə^r] *n* şagird; **a ~ driver** sürücü şagird; **a quick/slow** ~ tezanlayan/gecanlayan şagird

**learning** [ˈlə:nɪŋ] *n* təlim; öyrənmə; bilik; *He is a man of learning O, geniş bilikli adamdır*

**lease**[1] [li:s] *n* 1. arenda; icarə; icarə müqaviləsi; **period of** ~ icarə müddəti; **according to the terms of the** ~ icarə şərtlərinə müvafiq olaraq; *The lease expires in May İcarə müddəti may ayında başa çatır*; **to renew a** ~ icarəni təzələmək; *They have taken/held the house on a 10 year /long term lease Onlar evi 10 il müddətinə/uzun müddətə icarəyə götürüblər*; 2. *məc.* güc, qüvvət; *Your help gave him a new lease Sənin/Sizin köməyin/köməyiniz ona yeni güc/qüvvət verdi; The repair gave the car a new lease of life Təmir maşına yeni həyat verdi*

**lease**[2] [li:s] *v* 1. icarəyə/arendaya vermək; *The owner will not lease the apartment to noisy tenants Ev sahibi evi haylı-küylü kirayənişinlərə icarəyə verməyəcək*; 2. arendaya/ icarəyə götürmək; *They leased the flat from their aunt Onlar xalalarından mənzil icarəyə götürdülər*

**leasehold**[1] [ˈli:should] *n* icarəyə götürmə

**leasehold**[2] [ˈli:should] *adj* icarəyə götürülmüş; ~ **property** icarəyə götürülmüş mülk/əmlak

**least**[1] [li:st] *n* ən az, zərrə, zərrəcik; *That is the least we can expect Bizim gözləyə biləcəyimiz bir zərrədir*; **at** ~ nəhayətdə, ən sonda, ən son həddə, ən azı; *I don't mind in the least Mənim üçün qətiyyən fərqi yoxdur; What's the least you'll take for the picture? Sən/Siz şəkil üçün ən azı nə qədər pul istəyirsən/istəyirsiniz?*

**least**[2] [li:st] *adj* kiçik; az; zərrə; *Is there the least chance of success? Uğur qazanmağa bir zərrə qədər də olsa imkan/şans vardırmı? That's the least of my worries Bu məni narahat edən məsələlərdən ən kiçiyidir. Bu məni hər şeydən az narahat edir; He answered without the least hesitation O, bir an tərəddüd etmədən cavab verdi*

**least**[3] [li:st] *adv* əsla, qətiyyən; ən/lap az; **the ~ able pupil** ən az qabiliyyətli şagird; *He deserved it least of all O bu işə hamıdan az layiqdir; I am not the least tired Mən qətiyyən yorulmamışam; He wasn't the least interested O qətiyyən maraqlanmadı*

**leastways** [ˈli:stweɪz] *adv* hər halda, heç olmazsa

**leather**[1] [ˈleðə^r] *n* dəri; **patent** ~ laklanmış/laklı dəri

**leather**[2] [ˈleðə^r] *adj* dəri; dəridən olan; ~ **goods** dəri məmulatı; dəridən olan mal; **a ~ binding** dəri üz/cild

**leathery** [ˈleðərɪ] *adj* dəri; dəri kimi; *This meat is leathery Bu ət dəri kimidir*

**leave**[1] [li:v] *n* 1. icazə; **by your** ~ sənin/sizin icazənlə/icazənizlə; 2. məzuniyyət; *He is on leave O, məzuniyyətdədir; He is on sick leave O, xəstəliyə görə məzuniyyətdədir; I took 6 months' leave Mən 6 aylıq məzuniyyət götürdüm*;

◊ **to take** ***one's*** **~s** ayrılmaq; xudahafizləşmək; **to take French** ~ dərsdən/işdən icazəsiz çıxıb getmək

**leave**[2] [li:v] *v* 1. saxlamaq, qoyub getmək; yaddan çıxarmaq; *Leave some salad for dad Ata üçün bir az salat saxla/saxlayın; Let us leave it till tomorrow Gəl/Gəlin bunu sabaha saxlayaq; He left his coat in the taxi O paltosunu taksidə qoyub getdi; Leave it to me O mənim boynuma, Onu mənim ixtiyarıma ver/verin; It's not good leaving it to him Belə bir işi ona tapşırmaq olmaz; Don't leave me all alone Məni tək-tənha buraxma/buraxmayın; Leave the window open Pəncərəni açıq qoy/qoyun; Some things are better left unsaid Bəzi şeylər danışılmasa daha yaxşıdır; They left all the work to the girl Onlar bütün işi qızın öhdəsinə buraxdılar*; 2. *məc.* tapşırıq vermək; *Leave a word to say where you'll be Tapşır/Tapşırın ki, sənin/ sizin harada olacağını/olacağınızı mənə desinlər*; 3. qoyub getmək; etibar etmək; vəsiyyət etmək; *He left everything to his son O hər şeyi oğluna qoyub getdi; He was left an estate Ona miras olaraq sərvət qaldı*; 4. qalmaq; *He left one son Ondan bir oğlan uşağı qaldı; I've no money left Mənim pulum qalmayıb; How many minutes are left? Neçə dəqiqə qalır? We have an hour left before the train starts Qatarın yola düşməsinə hələ bir saat vaxt qalır; There is nothing left for it but to tell her Ona hər şeyi deməkdən savayı ayrı bir yol qalmır*; 5. *riyaz.* qalmaq; *7 from 10 leaves 3 10-dan 7-ni çıxanda 3 qalır*; 6. tərk etmək, çıxıb getmək; qurtarmaq; *He leaves work at seven O, işdən saat 7-də çıxır; They left school at 16 Onlar məktəbi 16 yaşında qurtardılar; I must leave you Mən səni/sizi qoyub getməliyəm/tərk etməliyəm; You are a fool to leave that job Belə bir işi qoyub getsən/getsəniz, səfehlik edərsən/ edərsiniz; He left his wife O, arvadını atıb getdi; Can I leave the table? Mən masadan/stoldan durub gedə bilərəmmi? The train left the rails Qatar relslərdən çıxıb*; 7. getmək; başqa yerə getmək; *They left Baki today Onlar bu gün Bakını tərk etdilər*; **to ~ about/around** hara gəldi atmaq; səpələmək, dağıtmaq; *Don't leave your toys lying around/about Oyuncaqlarını/ Oyuncaqlarınızı hara gəldi atma/ atmayın*; **to ~ off** 1) çıxarmaq, çıxarıb atmaq; *You can leave off your warm clothes now İndi sən/siz isti paltarlarını/paltarlarınızı çıxara bilərsən/ bilərsiniz*; 2) dayanmaq; kəsmək; *The rain has left off Yağış dayanıb/kəsib; Leave off arguing Mübahisəni kəs/kəsin*; **to ~ out** yaddan çıxarmaq, unutmaq; buraxmaq; *You have left out two words Sən/Siz iki söz buraxmısan/ buraxmısınız; We left that out of our calculations Biz yaddan çıxarıb onu hesablamamışıq; He feels left out O özünü sayılmaz adam kimi hiss edir; Leave me out of this Məni bu işə qatma/ qatmayın*; **to ~ over** qalmaq; *How much will that leave over? Onda bəs yerdə nə qədər qalır? Anything left over can go to the cats Bütün yerdə qalanları pişiklərə vermək olar*

**leaven**[1] [ˈlevn] *n* maya *(xəmir üçün)*

**leaven**[2] [ˈli:vənɪŋ] *v* acıtmaq *(xəmiri)*

**leavening** [ˈli:vənɪŋ] *n* 1. xəmirin mayası; 2. *məc.* söhbətin mayası; *Humor is a welcome leavening to conversation Yumor söhbətin mayasıdır/canıdır*

**leaves** [li:vz] *n* **leaf** *isminin cəm forması*

**leave taking** [ˈli:vˈteɪkɪŋ] *n* xudahafizləşmə; sağollaşma

**leavings** [ˈli:vɪŋz] *n* qalıq, tikə *(ərzaq, qida)*

**Lebanese** [.lebəˈni:z] *adj* livanlı, Livan sakini

**lecher** [ˈletʃə^r] *n* pozğun adam, ləçər *(qadın haq.)*

**lecherous** [ˈletʃərəs] *adj* pozğun, arvadbaz, seksə can atan, seksual

**linchpin** ['lɪntʃpɪn] *n tex.* dəmir tıxac
**linden**[1] ['lɪndən] *n bot.* cökə
**linden**[2] ['lɪndən] *adj* cökə; ~ **tree** cökə ağacı
**line**[1] [laɪn] *n* **1.** xətt; cizgi; **boundary** ~ sərhəd xətti; **~s on the hand** ovucun içində xətlər; **to draw a ~ from A to B** A nöqtəsindən B nöqtəsinə xətt çəkmək; **2.** *id.*: **white** ~ ağ xətt *(start xətti)*; **forward** ~ hücum xətti; **3.** cərgə; **to plant trees in a** ~ ağacları cərgə ilə əkmək; **4.** ip; kəndir; *The clothes are on the line Paltarlar ipdən asılıb*; **fishing** ~ balıq tutmaq üçün istifadə edilən ip; **5.** *harb.* xətt; **front** ~ cəbhə xətti; **behind the enemy ~s** düşmənin arxa xəttində; ~ **of defence** müdafiə xətti; *The soldiers stood in a line Əsgərlər cərgə ilə/xətt boyunca düzüldülər*; **6.** *tel.* xətt; *The line is engaged Xətt məşğuldur; He is on the line to them now İndi o onlarla telefonla danışır; Hold the line Dəstəyi yerə qoyma/ qoymayın; Can you get me a line to New York? Sən/Siz məni Nyu Yorkla birləşdirə bilərsənmi/ bilərsinizmi?; The lines are all down after the storm Qasırğadan/Tufandan sonra bütün telefon xətləri qırılıb*; **7.** dəmiryol xətti; **branch** ~ dəmiryolunda yol ayrıcı; **to cross the ~ by the bridge** dəmiryol xəttini körpünün üstündən keçirmək; *He fell on the lines O, dəmiryol xəttinin üstünə yıxıldı*; **8.** xətt; sətir; misra, xətkeş *(musiqidə)*; **air** ~ hava xətti; **pages 3, ~ 15** 3-cü səhifə, 15-ci sətir; *Drop a line to me and let me know about you Mənə biriki kəlmə yaz/yazın və qoy sənin/sizin haqqında/haqqınızda xəbərim olsun*; **a ~ of poetry** bir misra şer; **9.** sülalə, nəsil; **on his father's /mother's** ~ atasının/anasının nəslindən; *He is next in line of succession O, birbaşa varisdir; He came of a long line of doctors O, həkimlər nəslinin nümayəndəsidir*; **10.** ölçü, hədd; *He doesn't know where to draw the line O, ölçü bilmir; He draws the line at nothing Onun üçün hədd yoxdur, Onun gözü heç nədən doymur; He is right all along the line O hər işdə haqlı çıxır; We are on the wrong lines Biz düzgün yolda deyilik*; **something along those ~s** buna bənzər məsələlərdə; **to take a strong** ~ sərt xətt tutmaq/götürmək; *What's your line? Nə ilə məşğulsan/məşğulsunuz? It's hard lines on her Bu ona ağır zərbədir;*
◊ **to read between the ~s** yerin altını da üstünü də bilmək, sətirlərin arasını oxumaq, sətiraltı mənaları dərk etmək;
**line**[2] [laɪn] *v* **1.** xətt çəkmək; cərgələmək; cərgə ilə əkmək; *The road is lined with trees Yolun kənarlarında cərgə ilə ağaclar əkilmişdir; People lined the streets Adamlar yolda cərgə ilə dayanmışdılar*; **2.** düzlənmək, cərgə ilə durmaq; *The troops lined up on the square Qoşun meydanda cərgə ilə düzüldü; They lined up outside the box office Onlar kassanın qabağında cərgə ilə dayandılar*
**linage** ['laɪnɪdʒ] *n* əsli-nəsli olan; əsilzadə
**lineal** ['lɪnɪəl] *adj* birbaşa törəyən *(bir kəsdən)*; ~ **descendant** bilavasitə/birbaşa nəsil; ~ **heir** bilavasitə varis
**lineally** ['lɪnɪəlɪ] *adv* mənşə etibarı ilə, varislik baxımından
**lineament** ['lɪnɪəmənt] *n* sifət cizgiləri, xarakterik cəhət; **the ~s of a Mongol face** monqol sifətinə xas olan cizgilər
**linear** ['lɪnɪəʳ] *adj* **1.** xətt, xətti tənlik; ~ **measures** xətti ölçülər; ~ **defence** xətt boyunca müdafiə; **2.** xətli, xətlərdən ibarət olan
**lineman** ['laɪnmən] *n (pl* **-men** [-mən]) **1.** telefonçu, teleqrafçı; **2.** xətt nəzarətçisi, yol baxıcısı/nəzarətçisi
**linen** ['lɪnɪn] *n* **1.** kətan parça; **2.** yataq dəsti; alt paltarı, ağ
**liner** ['laɪnəʳ] *n* layner *(müəyyən marşrutla işləyən təyyarə)*
**linesman** ['laɪnzmən] *n (pl* **-men** [-mən]) *id.* yan xətt hakimi
**line-up** ['laɪnʌp] *n* **1.** qoyuluş; düzülüş; yerbəyer etmə; **a new ~ of the political parties** siyasi partiyaların yeni düzülüşü; **2.** oyunçuların oyuna başlamazdan əvvəl/qabaq düzülüşü *(futbolda, beysbolda və s.)*; **3.** proqramda verilən başlıqlar *(televiziya, radio və s.)*; *This evening's line up includes an interview with the British Foreign Minister Bu axşamkı proqrama Britaniyanın Xarici İşlər naziri ilə müsahibə daxildir*
**lingam** ['lɪŋgæm] *n* hindu tayfalarından biri olan Şivanın emblemi
**linger** ['lɪŋgəʳ] *v* ləng tərpənmək, yubanmaq; astagəllik etmək, ləngimək; **to ~ over a point** sual qarşısında aciz qalmaq; **to ~ a job** işi ləng yerinə yetirmək, işi ləngitmək; *Some guests lingered till after midnight Bəzi qonaqlar gecədən xeyli keçənə qədər ləngidilər*
**lingerie** ['læŋʒərɪ] *n fr.* qadın alt paltarı *(ipək və ya kətandan)*; **lacy** ~ krujevalı qadın alt paltarı
**lingering** ['lɪŋgərɪŋ] *adj* uzun-uzadı, uzun çəkən/sürən; **a ~ desease/illness** uzun sürən xəstəlik
**linguist** ['lɪŋgwɪst] *n* linqvist, dilçi; *He is a good linguist O, yaxşı dilçidir*
**liniment** ['lɪnɪmənt] *n tib.* maz, sürtmə dərmanı/məlhəmi
**lining** ['laɪnɪŋ] *n* astar; **an overcoat with a fur ~** xəz astarlı palto; **a jewelbox with a velvet ~** içi məxmər zinət qutusu;
◊ *Every cloud has a silver lining at söz.* ≅ *Hər gecənin bir gündüzü var*
**link**[1] [lɪŋk] *n* I **1.** həlqə *(zəncirdə)*; **2.** ilmə *(köynəkdə)*; **3.** əlaqəçi *(insan)*; **a ~ in a chain of evidence** sübutlar silsiləsində (bir) həlqə; **the ~ between the past and future** keçmişlə gələcək arasında əlaqə; **a missing ~** çatışmayan həlqə; **a ~ man** əlaqəçi; rabitəçi; **4.** ölçü vahidi *(uzunluqda: 7,92 inça və ya təxminən 20 sm-ə bərabərdir)*



**link** [lɪŋk] *n* II küçələri işıqlandırmaq üçün qoyulmuş fənər; **a ~ boy/a ~ man** pis işıqlandırılmış küçələrdə insanları müşahidə etmək üçün tutulmuş muzdlu adam/oğlan
**link**[2] [lɪŋk] *v* qoşmaq, qoşulmaq; **to ~ *one's* arm in/through another person's arm** qol-qola tutmaq, qoluna girmək; *The two towns were linked by a canal İki şəhər bir kanalla birləşdirildi*
**linking** ['lɪŋkɪŋ] *adj* **1.** qoşulan; birləşən; **2.** *dilç.* bağlayıcı; **a ~ verb** bağlayıcı fel
**links** [lɪŋks] *n* otlu/ot basmış torpaq sahəsi *(xüs. dəniz sahilində)*
**linnet** ['lɪnɪt] *n* kətan quşu *(cəh-cəh vuran quş – xüs. Avropada)*
**lino** ['laɪnou] *n* linolium
**lino cut** ['laɪnoukʌt] *n* dekorativ linolium
**linseed** ['lɪnsi:d] *n* kətan toxumu; ~ **oil** kətan toxumundan hazırlanmış yağ *(sürtkü yağı)*
**linsey-wolsey** [.lɪnzɪ'wu:lzɪ] *n yunla pambığın qarışığından toxunmuş qalın, möhkəm parça*
**lint** [lɪnt] *n* sarğı materialı
**lintel** ['lɪntl] *n* taxta haşiyə *(qapı və ya pəncərə çərçivəsində)*
**lion**[1] ['laɪən] *n zool.* şir; aslan
**lion**[2] ['laɪən] *adj* **1.** şir; aslan; ~ **hearted** şir ürəkli; qoçaq; qorxmaz; **2.** arzu edilən *(adam)*; **a ~ hunter 1)** şir ovçusu; **2)** məşhur adamları axtaran;
◊ **the ~'s share** böyük pay;
**lioness** ['laɪənɪs] *n* dişi şir/aslan
**lionize** ['laɪənaɪz] *v* vəhşiləşmək; şirə/aslana dönmək; *The famous explorer was lionized when he returned home Məşhur səyyah evə qayıtdıqda şirə/aslana dönmüşdü*
**lip** [lɪp] *n* dodaq; **the lower/upper ~** alt/üst dodaq; **a man with a cigar between his ~s** dodaqlarının arasında siqar olan kişi;
◊ **not to open *one's* ~s** danışmamaq, ağzına su alıb durmaq; **to bite *one's* ~s** dodaqlarını dişləmək *(özünü bir iş görməkdən saxlamaq üçün)*; **to give/to pay ~ service to *smth*.** quru-quru vəd etmək; **to hang on *smb.'s* ~s** bir kəsə diqqətlə qulaq asmaq; **to keep a stiff upper ~** heç bir emosiya bildirməmək; **to lick *one's* ~s** dodaqlarını yalamaq *(həzz/ləzzət alarkən)*
**lipstick** ['lɪpstɪk] *n* pomada *(dodaq boyası)*
**liquefy** ['lɪkwɪfaɪ] *v* mayeləşdirmək; mayeləşmək, mayeyə çevirmək/çevrilmək
**liquescent** [lɪ'kwesnt] *adj* likör, likörlü
**liqueur** [lɪ'kjuəʳ] *n* likör *(şirin spirtli içki)*
**liquid**[1] ['lɪkwɪd] *n* maye; *You have added too much liquid to the mixture Sən/Siz miksturaya çoxlu maye qatmısan/qatmısınız*
**liquid**[2] ['lɪkwɪd] *adj* **1.** maye, mayeləşmiş; maye halında olan; ~ **mud** maye halında olan/duru palçıq; ~ **gas** maye qaz; **2.** duru; şəffaf; parlaq; büllur, aydın; ~ **eyes** parlaq/büllur gözlər; **a ~ sky** parlaq/aydın səma; **3.** saf; qarşılığı olmayan; **4.** *mal.* asanlıqla satıla və ya pula dəyişdirilə bilən
**liquidate** ['lɪkwɪdeɪt] *v* **1.** borcu vermək və ya ödəmək; borcdan yaxa qurtarmaq; **2.** ləğv etmək *(şirkəti, idarəni)*; **3.** yaxa qurtarmaq; aradan götürmək; *Gangsters liquidated their rivals Qanqsterlər öz rəqiblərini aradan götürdülər*
**liquidation** [.lɪkwɪ'deɪʃn] *n* **1.** aradan götürmə/götürülmə; **to go into ~** müflis olmaq; müflisləşmək; **2.** ləğv etmə, xitam vermə; **~ of activity of the company** şirkətin fəaliyyətini ləğv etmə/fəaliyyətinə xitam vermə
**liquidator** [.lɪkwɪ'deɪtəʳ] *n* ləğv edən *(adam)*, təsviyəçi, təsviyəçilik tərəfdarı
**liquidity** [lɪ'kwɪdɪtɪ] *n* maye halı
**liquidize, -ise** [lɪ'kwɪdaɪz] *v* **1.** mayeləşdirmək; **2.** şirə halına salmaq *(meyvəni)*
**liquidizer, -iser** [lɪ'kwɪdaɪzəʳ] *n* mayeləşdirici *(elektrik cihaz)*
**liquor** ['lɪkəʳ] *n* **1.** spirtli içki; **2.** qidanın qaynadılıb alınmış şirəsi
**lira** ['lɪərə] *n* lirə *(İtaliyada və Türkiyədə pul vahidi)*
**lisle** [laɪl] *n* pambıq sap/ip
**lisp** [lɪsp] *v* fışıltılı səsləri [s, z] fısıltılı səslər [θ, ð] kimi tələffüz etmək; *məs.* **sixteen** [sɪksti:n] əvəzinə [θɪkθti:n] demək
**lissom** ['lɪsəm] *n* çeviklik, cəldlik, zirəklik
**list**[1] [lɪst] *n* siyahı; *Make a list of things I have to do today Bu gün mənim görməli olacağım işlərin siyahısını tut/tutun*; **to put *smb.'s* name on the ~** bir kəsin adını siyahıya salmaq; **the free ~** gömrük rüsumundan azad edilmiş malların siyahısı
**list**[2] [lɪst] *v* I siyahıya almaq; siyahı tərtib etmək; *He is not listed Onun adı siyahıda qeyd edilməyib/yoxdur*
**list** [lɪst] *v* II əyilmək *(bir böyrü üstə, xüs. gəmi haq.)*; yana əyilmək
**listen** ['lɪsn] *v* **1.** qulaq asmaq, dinləmək; eşitmək; *The boys listened but heard nothing Oğlanlar qulaq asdılar, lakin heç nə eşitmədilər*; **to ~ in/to (radio)** radioya qulaq asmaq; *Did you listen in/to the Prime Minister yesterday? Dünən sən/siz baş nazirə qulaq asdınmı/asdınızmı? (radioda)*; **2.** razılaşmaq; sözünə baxmaq; *Don't listen to him Onun sözünə qulaq asma/asmayın, Onunla razılaşma/razılaşmayın*
**listener** ['lɪsnəʳ] *n* dinləyici
**listless** ['lɪstlɪs] *adj* **1.** dalğın; əzgin; **2.** qaydasız, nizamsız, səliqəsiz
**lists** [lɪsts] *n süvari ordu üçün döyüş meydanı/cəng yeri*; **to enter the ~** döyüşə çağırışı qəbul etmək
**lit** [lɪt] **light** *felinin pt, pp formaları*
**litany** ['lɪtənɪ] *n* kilsədə moizə
**litchi** ['li:tʃi:] *n bot.* muşmula *(Benqal və Çin meyvəsi)*

**liter** ['li:tə^r] *n amer* = **litre**
**literacy** ['lɪtərəsɪ] *n* savadlılıq
**literal** ['lɪtərəl] *adj* 1. hərfi, hərfiyyən; 2. orijinalla eyniyyət təşkil edən; **a ~ translation** düzgün/səlis tərcümə; 3. həqiqi; **in the ~ sense of the word** sözün həqiqi mənasında
**literally** ['lɪtərəlɪ] *adv* sözün müstəqim mənasında; həqiqətən; *They took her words literally Onlar onun sözlərini müstəqim mənada başa düşdülər*
**literary** ['lɪtərərɪ] *adj* ədəbi; bədii; **a ~ man** ədəbiyyatçı; ədəbiyyatı bilən; **the ~ profession** ədiblik/yazıçılıq sənəti; **a ~ style** bədii üslub; **~ property** ədəbi mülkiyyət *(müəllifin qonorar hüququ)*
**literate** ['lɪtərət] *adj* 1. savadlı; oxumuş; 2. mədəniyyətli
**literati** [.lɪtə'ra:tɪ] *n* ziyalı kütləsi
**literature** ['lɪtrətʃə] *n* 1. ədəbiyyat; 2. müəyyən bir fənnə aid olan elmi kitablar; **the 18th century English** ~ 18-ci əsr ingilis ədəbiyyatı; 3. çap edilmiş ədəbiyyat; *We shall send you some literature about our scientific research work Biz elmi-tədqiqat işimiz haqda sənə/sizə bir neçə ədəbiyyat göndərəcəyik*
**lithe** [laɪθ] *adj* elastik; plastik; **~ movements** elastik hərəkətlər; **to make *one's* muscles ~** əzələlərini elastik/hərəki etmək
**lithograph¹** ['lɪθəgra:f] *n* litoqrafiya
**lithograph²** ['lɪθəgra:f] *v* litoqrafiya üsulu ilə çap etmək
**lithographic** [.lɪθə'græfɪk] *adj* litoqrafik
**lithography** [lɪ'θɔgrəfɪ] *n* litoqrafiya *(nəşriyyatda kitab çapı ilə bağlı istifadə edilən sahə)*
**Lithuanian¹** [.lɪθu'eɪnɪən] *n* 1. Litvalı; 2. Litva dili
**Lithuanian²** [.lɪθu'eɪnɪən] *adj* Litva; **the ~ language** Litva dili
**litigant** ['lɪtɪgənt] *n* hüquqşünas
**litigate** ['lɪtɪgeɪt] *v* 1. məhkəmə işi qaldırmaq; məhkəməyə vermək; 2. məhkəmədə üzə durmaq
**litigation** [.lɪtɪ'geɪʃn] *n* məhkəməyə getmə; məhkəməyə iş vermə
**litigious** [lɪ'tɪdʒəs] *adj* 1. məhkəməbaz, ərizəbaz; 2. məhkəmə yolu ilə baxılan/baxılmalı olan
**litmus** ['lɪtməs] *n* lakmus *(qələviyə saldıqda dərhal rəngini dəyişən kağız)*; **~ paper** lakmus kağızı
**litotes** ['laɪtouti:z] *n* litota *(kiçiltmə)*
**litre** ['li:tər] *n (qısa forması L)* litr
**litter¹** ['lɪtə^r] *n* I 1. örpək *(kürəyinə, çiyninə və s. salmaq üçün)*; 2. üstünə örpək çəkilmiş xərək *(xəstə və ya yaralı adamı aparmaq üçün)*
**litter** ['lɪtə^r] *n* II 1. zibil, qırıq-quruq; qalıq, qırıntı *(çörək və s.)*; *Pick up your litter after your picnic Piknikdən sonra zir-zibilini/zir-zibilinizi yığışdır/yığışdırın*; 2. zibillik; *Her room was in such a litter that she was ashamed to ask me in Otağı elə zir-zibilin içində idi ki, o məni içəri dəvət etməyə utandı*; 3. saman, küləş; samandan hörülmüş şey *(fermada)*; 4. yeni doğulmuş heyvan balası
**litter²** ['lɪtə^r] *v* zibilləmək; zibillənmək; **to ~ *smth.* with *smth.*** bir şeyi bir şeylə zibilləmək; **to ~ a room with papers** otağı kağızla zibilləmək; 2. heyvanı yemləmək; heyvana ot/saman vermək
**litter-basket** ['lɪtəbaskɪt] *n* zibil səbəti
**litter-bin** ['lɪtəbɪn] *n* zibil qabı
**little¹** ['lɪtl] *n* 1. az, bir az, az miqdar/kəmiyyət; *Give me a little! Mənə bir az ver/verin! Stay for a little Bir az qal/qalın!* **after a ~** bir azdan sonra; *He knows a little of everything O hər şeydən bir az bilir*; 2. azı, az-çox; *I did what little I could Mən əlimdən gələni etdim, Mən az-çox nə bilirdimsə, onu da etdim; The little of his work I've seen Mən onun işinin azını görmüşəm; Every little helps Azın da köməyi vardır*; 3. çox az; *He knows little O çox az bilir; I see little of him Mən onu çox az görürəm; I could make little of the text Mən mətndən çox az şey başa düşdüm*
**little²** ['lɪtl] *adj* 1. kiçik; balaca; az; **a ~ boy** balaca/kiçik oğlan; *I've little time for reading Mənim oxumağa az vaxtım vardır; He got little benefit from his trip O, səfərdən az xeyir götürdü*; **the ~ finger** balaca barmaq; **the ~ ones** balacalar; **a ~ dog/ boat/house** balaca it/qayıq/ev; *Don't let little things like that upset you Qoy səni/sizi belə kiçik işlər dilxor etməsin*; 2. bir az/qədər; *I know a little German Mən alman dilini bir az bilirəm; Have a little soup Bir az sup iç/için*
**little³** ['lɪtl] *adv* 1. az; *He knows little about him O onun haqqında az bilir*; **~ by ~** az-az; *He was here a little more than an hour O, bir saatdan bir az çox burada oldu; I tried to say as little as possible Mən çalışdım ki, mümkün qədər az danışım; He is little better than a thief O, oğrudan heç nədə geri qalmır; It's little short of madness Bu sadəcə olaraq dəlilikdir*; 2.: **a ~** bir balaca/az; *The hat's a little large Şlyapa bir balaca böyükdür; I am a little afraid Mən bir az/balaca qorxuram*
**littoral¹** ['lɪtərəl] *n* dəniz kənarında yerləşən ölkə /şəhər
**littoral²** ['lɪtərəl] *adj* dənizkənarı, dənizyanı
**lit up** ['lɪtʌp] *adj sl.* sərxoş, lülqənbər
**liturgical** [lɪ'tə:dʒɪkl] *adj* dini mərasimə aid olan; dini mərasimlə bağlı
**liturgy** ['lɪtə:dʒɪ] *n* liturgiya *(xristianların ən əsas ibadət ayini)*
**livable** ['lɪvəbl] *adj* 1. yaşamaq üçün yararlı, dözümlü; **~ (in)** yaşamaq üçün yararlı *(otaq, ev və s.)*; **~ (with)** yola gedilməli; 2. birgə yaşamağa layiq olan
**live¹** [laɪv] *n* canlı veriliş *(televiziyada, radioda)*
**live²** [laɪv] *adj* 1. diri; **~ fish** diri balıq; *The cat was playing with a live mouse Pişik diri siçanla oynayırdı*; 2. yanan, közərən; **~ coals** yanan/ közərən kömür; 3. partladılmamış; **a ~ mine/ bomb** partladılmamış mina/bomba; 4. canlı *(əvvəlcədən lentə yazılmamış)*; **~ broadcast** canlı veriliş; *It was a live broadcast O, canlı veriliş idi*; 5. maraqlı; **a ~ question** maraqlı sual/məsələ
**live³** [lɪv] *v* 1. yaşamaq; ömür sürmək; *He lived most of his life abroad O, ömrünün çox hissəsini xaricdə yaşadı; He lived a long life O, uzun ömür sürdü*; 2. sağ qalmaq; *He hasn't long to live Onun ömrünün sonuna az qalıb, O az yaşayacaq; Can he live through that night? O bu gecədən sabaha sağ qala/çıxa bilərmi? As long as I live I'll remember you Ömrüm boyu səni/sizi xatırlayacağam; Once upon a time there lived... Biri var idi, biri yox idi...;*
◊ *Live and learn Yaşa və öyrən; They lived like lords Onlar bəy kimi yaşadılar*; **to ~ down** yaşayıb unutmaq; yaşadıqca yaddan çıxartmaq; **to ~ for** ömrünü həsr etmək; *He lives for ballet O, ömrünü baletə həsr etdib; She lives entirely for her children O öz ömrünü tamamilə uşaqlarına həsr edir, O, uşaqları üçün yaşayır*; **to ~ in** bir yerdə yaşamaq; *The children lived in boarding school Uşaqlar internat məktəbdə yaşadılar*; **to ~ off** bir şeyin/kəsin hesabına yaşamaq; *He lives off his salary O, məvacibi hesabına yaşayır; He lives off his wife O, arvadının hesabına yaşayır*; **to ~ on** yaşamaq, yaşamaqda davam etmək; *She hasn't much to live on Onun yaşamağa bir o qədər də ömrü qalmayıb*; **to ~ out 1)** ömür sürmək; ömrü başa vurmaq; *I'll live out the rest of my life in the village Mən ömrümün qalan hissəsini kənddə yaşayacağam*; 2) yaşamaq; *They live out of tins Onlar konservlə yaşayırlar*; **to ~ up** sadiq qalmaq; layiq olmaq; ümidi doğrultmaq; *He doesn't live up to his principles O öz prinsiplərinə sadiq qalmır; They haven't lived up to our expectations Onlar bizim ümidlərimizi doğrultmayıblar*; **to ~ with** dözmək, razılaşmaq; barışmaq; *We have to live with the situation Biz vəziyyətlə razılaşmalıyıq/barışmalıyıq*
**livelong** ['lɪvlʌŋ] *adj* uzunu; boyu; bütün; **the ~ day/night** bütün gün/gecə, bütün gün/gecə uzunu
**lively** ['laɪvlɪ] *adj* dəcəl, canlı; hərəki, nadinc; **a ~ child** dəcəl/nadinc uşaq; **a ~ imagination/ description** canlı təsəvvür/təsvir; **a ~ argument** canlı mübahisə/müzakirə
**liven** ['laɪvn] *v* canlandırmaq; canlanmaq; şənləndirmək, şənlənmək; rövnəqləndirmək, rövnəqlənmək; *How can we liven things up? Biz işləri necə canlandıra bilərik? The party is beginning to liven up Qonaqlıq canlanmağa başlayır; The tourists liven up the town Turistlər şəhəri canlandırırlar*
**liver** ['lɪvə^r] *n* 1. *anat.* qara ciyər; 2. ciyər *(qida)*
**liveried** ['lɪvərɪd] *adj* 1. əyninə libas geyinmiş; 2. ilxıçı, ilxıya baxan işçi



**liverish** ['lɪvərɪʃ] *adj* 1. öd kimi; 2. *məc.* ətiacı; acıdil
**liver wurst** ['lɪvəwə:st] *n* ciyər sosiskası
**livery** ['lɪvərɪ] *n* 1. *zadəgan ailələrində xidmət edən qulluqçuların geydikləri uniforma/paltar*; **in ~** uniformada; **out of ~** uniforma geyməmiş; 2. libas, paltar; **trees in the ~ of spring** bahar libasını geymiş ağaclar; **birds in their winter ~** qış libasını geymiş quşlar; 3. ilxı *(at)*
**lives** [laɪvz] *n* **life** *isminin cəm forması*
**livestock** ['laɪvstɔk] *n* ilxı; naxır; sürü
**livid** ['lɪvɪd] *n* 1. mavi-boz rəng; 2. göy rəng; **~ with cold** soyuqdan göyərmiş; 3. qəzəbli; bozarmış; *He was livid with us Onun bizə yaman acığı tutmuşdu, O bizə bozardı*
**living¹** ['lɪvɪŋ] *n* yaşayış; **standard of ~** yaşayış səviyyəsi; *He makes his living by painting O, rəsm çəkməklə yaşayışını təmin edir, O, çörəkpulunu rəssamlıqdan çıxarır; They are used to gracious living Onlar təmtəraqlı yaşayışa öyrəşiblər*; **~ conditions** yaşayış şəraitləri; **a ~ room** yaşayış otağı; **a ~ wage** yaşayış üçün minimum əməkhaqqı
**living²** ['lɪvɪŋ] *adj* 1. canlı; yaşayan; ömür sürən; mövcud; mövcud olan; **a ~ language** canlı dil; **within /in ~ memory** hələ yaddaşlarda canlı olan *(yaşayan)*; 2. əsl; əslinə oxşar; *He is the living image of his father O, atasına çox oxşayır, O, atasını itələyib yerində durub*; 3. güclü; fəal, sönməz, sönməyən; **a ~ hope** sönməz/sönməyən ümid
**lizard** ['lɪzəd] *n zool.* kərtənkələ; kələz
**llama** ['la:mə] *n* lama *(Cənubi Amerikada sıx yunu olan heyvan)*
**load¹** [loud] *n* 1. yük *(gəmidə, maşında və s.)*; *The ship carried a load of coal Gəmi kömür yükü daşıdı; He dumped his load on the floor O, yükünü guppultu ilə döşəmənin üstünə tulladı*; **peak ~** maksimal yük; 2. *məc.* yük *(müəyyən həcmdə iş)*; **a teaching ~** tədris/dərs yükü; *He has a heavy load of responsibility Onun ağır məsuliyyət yükü vardır*
**load²** [loud] *v* 1. yükləmək, yüklənmək; *They loaded sacks on to a cart/mules Onlar kisələri arabaya /qatırlara yüklədilər; Let's load the car Gəl/Gəlin maşını yükləyək; The car is so loaded it can hardly move Maşın o qədər yüklənib ki, güclə hərəkət edir; He loads work on to his assistants O öz köməkçilərini işlə yükləyir*; 2. doldurmaq *(tüfəngi, silahı)*; *He loaded his gun and aimed at O, tüfəngini doldurdu və nişan aldı*
◊ **to be/to get ~ed** küpünə girmək *(çox içmək)*
**loaded** ['loudɪd] *adj* 1. yüklənmiş; doldurulmuş; 2. içinə güllə/mərmi qoyulmuş *(tüfəng/top haq.)*
**loaf¹** [louf] *n (pl* **loaves***)* 1. buxanka; **a white ~** ağ çörək buxankası; **black ~** qara çörək buxankası; 2. baş, kəllə, qafa; *Use your loaf! Başını/Başınızı işlət/işlədin!*

◊ **loaves and fishes** Allahın yaratdığı nemətlər, Allah verən

**loaf[2]** [louf] *v* avaralanmaq, veyllənmək, avara-avara gəzmək

**loafer** ['loufə^r] *n* tənbəl, avara, səfil, veyl

**loam** [loum] *n* **1.** bərəkətli *(torpaq haq.)*; **2.** gil/gilli torpaq; **3.** kərpic gili, kərpic kəsmək üçün gil

**loamy** ['loumı] *adj* **1.** bərəkətli; **2.** gilli; ~ **land** gilli torpaq

**loan[1]** [loun] *n* **1.** istiqraz; ssuda; borc pul; **government** ~ dövlət istiqrazı; **domestic and foreign** ~ daxili və xarici istiqraz; *The firm got a loan from the bank Firma bankdan borc pul /ssuda aldı; I got a loan from my brother Mən qardaşımdan borc pul aldım;* 2. kirayə; *I asked for the loan of his car Mən xahiş etdim ki, o, maşınını mənə kirayəyə versin*

**loan[2]** [loun] *v* **1.** borc vermək; **2.** kirayəyə vermək; **3.** ssuda/istiqraz vermək

**loath, loth** [louθ] *adj* meylsiz, həvəssiz, könülsüz; **to be ~ to do** *smth.* bir iş görməyə könülsüz/ həvəssiz olmaq

**loathe** [louð] *v* **1.** zəhləsi getmək; ürəyi bulanmaq; *She was seasick, and loathed the smell of greasy food Onda dəniz xəstəliyi var idi və yağlı yeməklər onun ürəyini bulandırırdı;* **2.** xoşlamamaq, xoşu gəlməmək; *He loathed travelling by air O, təyyarə ilə səyahət etməyi xoşlamırdı*

**loathing** [louðıŋ] *n* zəhləsi getmə; ürəkbulanma; xoşlamama

**loathsome** ['louðsəm] *adj* ürəkbulandıran, ürəkbulandırıcı, zəhlətökən

**loaves** [louvz] *n* **loaf** *isminin cəm forması*

**lob** [lob] *v* **1.** topa zərbə vurmaq; **2.** topu torun üstündən aşırmaq

**lobby[1]** ['lobı] *n (pl* **lobbies)** **1.** giriş otağı; **the ~ of a hotel** mehmanxananın giriş otağı; **2.** *Lordlar palatasında ictimaiyyət nümayəndələri ilə palata üzvlərinin görüş otağı;* **3.** *səsvermədən sonra geri qayıtmaq üçün Lordlar palatasında olan dəhlizlərdən biri*

**lobby[2]** [lobı] *v* qanunu qəbul etdirmək/rədd etmək; **to ~ a bill through the Senate** qanun layihəsini Senatdan keçirmək

**lobe** [loub] *n* **1.** mərcək, sırğalıq; **2.** ciyərin/ beyinin bir hissəsi

**lobster** ['lɔbstə^r] *n* **1.** omar *(irioynaqlı dəniz xərçəngi)*; **2.** omar əti

**local** ['loukl] *adj* **1.** yerli; **the ~ doctor** ərazi həkimi; **~ customs** yerli ənənələr; **a ~ government** yerli hökumət; **~ time** yerli vaxt; **2.** yerli, lokal; **a ~ anaesthetic** yerli/lokal anesteziya /keyitmə; **3.** *d.d.* fahişəxana, qəhbəxana

**locale** [lou'ka:l] *n* bir səhnə *(hadisədən, bədii əsərdən, romandan və s.)*

**localism** ['loukəlızm] *n* **1.** lokalizm; **2.** lokal danışıq *(dialekt, ləhcə və s.)*

**locality** [lou'kælıtı] *n (pl* **-ties** [-ti:z]) yer; ölkə, vilayət; sahə; **defended** ~ *hərb.* müdafiə sahəsi/ rayonu; **inhabited/populated** ~ məskunlaşmış yer/ölkə/rayon/vilayət

**localization, -isation** [.loukəlaı'zeıʃn] *n* lokallaşdırma, lokallaşma

**localize, -ise** ['loukəlaız] *v* yerliləşdirmək, lokallaşdırmaq; *There is little hope to localize the disease Xəstəliyi lokallaşdırmağa ümid azdır*

**locate** [lou'keıt] *v* göstərmək; yerini göstərmək; tapmaq; **to ~ a town on the map** şəhəri xəritədə göstərmək; **2.** yerləşdirmək *(müəyyən bir yerdə); Where is the new factory to be located? Yeni fabrik harada yerləşdirilməlidir?;* **3.**: **to be ~d** yerləşmək; *Our university is located in Rashid Behbudov street Bizim universitet Rəşid Behbudov küçəsində yerləşir*

**location** [lou'keıʃn] *n* **1.** yerləşmə; **2.** mövqe, yer; mövqeyini təyin etmə *(bir şeyin)*; **3.** yerləşdirmə; **4.** *hərb.* dislokasiya *(qoşunun müəyyən ərazidə yerləşməsi)*

**locator** [lou'keıtə^r] *n amer.* yerölçən *(mütəxəssis)*

**loci** ['lousaı] **locus** *isminin cəm forması*

**lock[1]** [lɔk] *n* I **1.** tel, zülf; *pl* saç; **2.** yumaq *(yun)*; **3.** dəstə *(saç)*

**lock** [lɔk] *n* II **1.** kilid, qıfıl; qapı sürgüsü; **to keep/to put** *smth.* **under** ~ bir şeyi qıfıl altında saxlamaq; **2.** çaxmaq *(silahda)*; **~ stock and barrel** dolu tüfəng; **3.** şlüz *(çayda, kanalda suyun qabağını kəsib saxlamaq üçün istifadə edilən xüsusi qurğu)*; **4.** *tex.* dönmə radiusu; *This car has a good lock Bu maşının dönmə radiusu yaxşıdır*

**lock[2]** [lɔk] *v* **1.** kilidləmək; **2.** sıxmaq *(güləşdə: qucağa)*; **3.** qıcamaq *(dişləri)*; **4.** tormozlamaq, tormoz vermək; **to ~ away** qıfıl altında gizlətmək; **to ~** qıfılda saxlamaq *(otaqdan bayıra buraxmamaq); I locked myself in my room Mən otağa girib qapını qıfılla bağladım;* **5.** *məc.* qıfılbənd olmaq, qucaqlaşmaq, sarmaşmaq; *They were locked in each other's arms Onlar bir-birinə sarmaşmışdılar;* **6.** kilidlənmək, qıfıllanmaq; *This trunk doesn't lock Bu çamadan/sandıq qıfıllanmır;*

◊ **to ~** qıfıllamaq; **to ~ the stable door after the horse has bolted/has been stolen** at oğurlandıqdan sonra qapını qıfılla bağlamaq; ≅ toydan sonra nağara

**locker** ['lɔkə^r] *n* qıfıllanan qutu/şkaf/stol/seyf

**locket** ['lɔkıt] *n* medalyon

**lock-gate** ['lɔkgeıt] *n* şlüz qapısı

**lockkeeper** ['lɔkki:pə^r] *n* şlüz rəisi

**locknut** ['lɔknʌt] *n* kontrqayka *(tərs yivli qayka)*

**locksman** ['lɔksmən] *n* = **lockkeeper**

**locksmith** ['lɔksmıθ] *n* çilingər

**loco[1]** ['loukou] *n* **1.** *bot.* astraqal *(zəhərli bitki)*; **2.** astraqaldan zəhərlənmə xəstəliyi *(həm də ~* **disease)**

**loco[2]** ['loukou] *adj sl.* dəli, ağıldan kəm, psix, başdan xarab; **to go ~** dəli olmaq, ağlını itirmək



**locomotion** [.loukə'mouʃn] *n* hərəkət etmə, hərəkət; **means of ~** nəqliyyat vasitələri

**locomotive[1]** [.loukə'moutıv] *n* lokomotiv, parovoz, teplovoz, elektrovoz

**locomotive[2]** [.loukə'moutıv] *adj* hərəkətedən, hərəkətverici, hərəkətə səbəb olan; **~ power** hərəkətverici qüvvə

**locum** ['loukəm] *n* həkimi/keşişi əvəz edən şəxs

**locus** ['loukəs] *n (pl* **loci** ['lousaı]) yeri dəqiq bəlli olan əşya

**locust** ['loukəst] *n zool.* çəyirtkə

**locution** [lə'kju:ʃn] *n* ifadə, idiom, danışıq üslubu

**lodge[1]** [lɔdʒ] *n* **1.** kiçik xidmət otağı *(gözətçi, dalandar və s. üçün)*; **2.** ov mövsümündə istifadə edilən daxma; **3.** loja *(teatrda bir neçə adamlıq xüsusi yer)*

**lodge[2]** [lɔdʒ] *v* **1.** sığınacaq vermək; gecələmək üçün yer vermək; *We were lodged in the school building Bizə məktəb binasında gecələməyə yer verdilər;* **2.** pulla kirayə etmək; **3.** bankda saxlamaq; **to ~ *one's* valuables in the bank while on holiday** məzuniyyətdə olduqda qiymətli əşyalarını bankda saxlamaq; **4.** şikayət vermək; **to ~ a complaint** şikayət ərizəsi vermək

**lodger** ['lɔdʒə^r] *n* kirayəçi, kirayənişin; *She takes in lodgers O, kirayəçi/kirayənişin götürür*

**lodgement** ['lɔdʒmənt] *n* **1.** kirayə etmə; **2.** qurum, toplantı; yığılma; **a ~ of dirt in a pipe** qəlyanda qurum yığılması

**lodging** ['lɔdʒıŋ] *n* yaşayış üçün kirayə edilmiş otaq/otaqlar; *It's cheaper to live in lodgings than in a hotel Mənzil kirayə edib yaşamaq mehmanxanada yaşamaqdan ucuz başa gəlir;* **a ~ house** kirayəyə götürülmüş ev

**loft[1]** [lɔft] *n* çardaq, dam; **hay ~** ot damı; **pigeon ~** göyərçin damı

**loft[2]** [lɔft] *v* vurmaq; zərbə endirmək *(topa)*

**loftily** ['lɔftılı] *adv* iftixarla, vüqarla, qürurla, təkəbbürlə, məğrur-məğrur, məğrur bir tərzdə

**loftiness** ['lɔftınıs] *n* məğrurluq; təkəbbürlülük, vüqarlılıq

**lofty** ['lɔftı] *adj* **1.** hündür; **a ~ tower** hündür qüllə; **2.** *məc.* yüksək *(arzu, hiss, məqsəd və s.)*, nəcib; **3.** vüqarlı; məğrur; **a ~ appearance** məğrur duruş/görünüş/görkəm

**log[1]** [lɔg] *n* I **1.** kötük; **2.** *məc.* ölü; *I slept like a log Mən ölü kimi yatdım*

**log** [lɔg] *n* II **1.** gəminin üzmə sürətini ölçən cihaz; **2.** hadisələrin qeydiyyatı aparılan kitab *(gəmidə)*

**log** [lɔg] *n* III **logarithm** *sözünün qısaldılmış forması*

**log[2]** [lɔg] *adj* ağacdan tikilmiş; **~ cabin** ağacdan tikilmiş daxma

**log[3]** [lɔg] *v* kitabda qeydiyyata salmaq *(gəmidə və ya təyyarədə)*

**logarithm** ['lɔgərıðəm] *n riyaz.* loqaritm

**loggerheads** ['lɔgəhedz] *n* didişmə; dalaşma; çəp gəlmə; *They are always loggerheads Onlar həmişə didişirlər, Onların sözü həmişə bir-biri ilə çəp gəlir; He is constantly at loggerheads with his wife O daim arvadı ilə dalaşır/didişir*

**loggia** ['lɔdʒıə] *n* bir başı bağa tərəf açıq olan ev

**logic** ['lɔdʒık] *n* məntiq; **a mistake in ~** məntiqi səhv

**logical** ['lɔdʒıkəl] *adj* məntiqi; *It's the logical thing to do Bu işi görmək məntiqə uyğundur; The logical conclusion is that... Məntiqi nəticə belədir ki,...*

**logically** ['lɔdʒıkəlı] *adv* məntiqcə, məntiqə görə/ uyğun olaraq; məntiqə uyğun şəkildə; məntiq baxımından; məntiqi cəhətdən

**logistics** [lə'dʒıstıks] *n* **1.** arxa cəbhə və təchizat; **2.** maddi-texniki təchizat; **3.** arxa cəbhənin işinin təşkili və həyata keçirilməsi

**log-juice** ['lɔgdʒu:s] *n* ucuz şərab

**logman** ['lɔgmən] *n (pl* **-men** [-mən]) meşəçi, odunçu, odun qıran

**loin** ['lɔın] *n* **1.** boş əti *(malın, qoyunun boşluq hissəsinin əti)*; **2.** bel; qurşaq; **~ cloth** qurşaq sarğısı; **3.** *pl evf.* cinsi orqanlar

**loiter** ['lɔıtə^r] *v* yubana-yubana/dayana-dayana getmək; **to ~ on *one's* way home** evə gedərkən yolda ləngimək; **to ~ the hours away** saatları boş-boşuna keçirmək/öldürmək; saatlarla boş dayanmaq; **to ~ over a job** işi axıra çatdırmamaq/ləngitmək

**loiterer** ['lɔıtərə^r] *n* **1.** yavaş/astagəl adam; **2.** tənbəl; avara, veyl adam

**loll[1]** [lɔl] *n* tənbəllik, avaraçılıq, veyllik

**loll[2]** [lɔl] *v* tənbəl-tənbəl hərəkət etmək, veyllənmək; asta-asta tərpənmək; ləhləyə-ləhləyə hərəkət etmək; *She was lolling on the sofa O, divanın üstündə sərilib qalmışdı; It was so hot – the dog's tongue was lolling out Hava elə isti idi ki, it dilini çıxardıb ləhləyirdi*

**lollipop** ['lɔlıpɔp] *n* nabat *(şirni: çöpün üstündə yalamaq üçün)*

**lollop** ['lɔləp] *v* **1.** tənbəl-tənbəl yerimək, avaralanmaq; **2.** hoppanıb düşmək, irəli-geri çəkilmək

**lolly** ['lɔlı] *n* **1.** = **lollipop**; **2.** meyvə şirəsi; **iced ~** donmuş meyvə şirəsi *(çubuğun ucunda)*; **3.** *sl.* asan yolla qazanılan və küləyə sovurulan pul

**lone** [loun] *adj* tək, tənha; **to play a ~ hand** *məc.* bir işi təkbaşına görmək

**loneliness** ['lounlınıs] *n* təklik, tənhalıq; **to suffer from ~** tənhalıqdan əziyyət çəkmək, tənha qalıb darıxmaq

**lonely** ['lounlı] *adj* tək, yalqız; tənha; **a ~ traveller** yalqız səyahətçi; **a ~ girl** tənha qız; **to feel ~** özünü tənha/tək hiss etmək; **a ~ house/village** tənha ev/kənd

**lonesome** ['lounsəm] *adj* tənha, yalqız; **a ~ place** tənha yer; **to feel ~** özünü tənha hiss etmək; **a ~ journey** tənha səfər

**long[1]** [lɔŋ] *n* uzun müddət/fasilə; *The work won't*

*take you long Bu iş sənin/sizin vaxtını/vaxtınızı çox almayacaq; Will you be away for long? Sən/Siz uzun müddət olmayacaqsan?/olmayacaqsınız?* **at (the) ~est** ən uzaq vaxt; ən geci; *I can wait three days at (the) longest Ən uzağı/geci mən üç gün gözləyə bilərəm;* **the ~est and the short of it** nəhayət; əvvəl-axır

**long²** [lɔŋ] *adj* **1.** **(-er, -est)** uzun; **~ hair /legs/nose** uzun saç/ayaqlar/burun; **~ distance** uzun məsafə; **~ life** uzun ömür; *How long is the river Nile? Nil çayı nə uzunluqdadır? The new road is twenty miles long Yeni yol 20 mil uzunluğundadır;* **to have a ~ arm** *məc.* əli uzun olmaq; çox şeyə qadir olmaq; **the ~ arm of the law** qanunun hər yerdə işləməsi; **to make a ~ arm for** *smth.* əli bir şeyə çatmaq *(xüs. stol arxasında); It's as broad as it's long Gen-boldur;* **2.** uzun *(vaxt mənasında); He was ill for long O, uzun vaxt/müddət xəstə oldu; How long are the holidays? Məzuniyyətin müddəti nə qədərdir? Long time no see d.d. Çoxdandır ki, səni/sizi görmürəm;* **3.** *fon.* uzun *(sait səs haq.);* **4.** uzun-uzadı; **to have a ~ look at** *smb.* bir kəsə uzun-uzadı baxmaq; **a ~ term** uzunmüddətli, uzun müddət davam edən; **~ term agreement** uzunmüddətli razılaşma/ müqavilə; **a ~ shore man** sahildə gəmini yükləyib boşaldan işçi; **~ time** uzun müddət davam edən; **a ~ time journey** uzunmüddətli/uzun müddət davam edən səyahət

**long³** [lɔŋ] *v* çox istəmək, həsrətində olmaq; can atmaq; **to ~ to go away** çıxıb getməyə can atmaq; **to ~ for** *smth./smb.* **to do** *smth.* bir iş görmək üçün bir şeyə/kəsə əl uzatmaq/atmaq; *The girl longed for the boy to say something Qız can atdı ki, oğlan nə isə desin; I am longing to see you Mən səni/ sizi görmək həsrətindəyəm*

**long⁴** [lɔŋ] *adv* **1.** uzun müddətə; *Stay as long as you like İstədiyin/İstədiyiniz müddətə qal/qalın; I've long wanted to meet her Mən çoxdandır ki, onu görmək istəyirəm;* **as/so ~ as** işdir, əgər; *You may borrow the book so long as you don't lend it to anyone else Əgər sən/siz kitabı heç kimə verməsən/verməsəniz, onu istədiyin/istədiyiniz müddətə borc ala bilərsən/bilərsiniz;* **2.** uzun müddət *(müəyyən vaxtdan bəri); It happened long ago Bu çox-çox qabaq baş vermişdi;* **3.** müddətində, ərzində; **all day ~** bütün günü; **any/much/no ~er** bir daha, heç, qətiyyən, qəti

**long-eared** ['lɔŋ'ɪəd] *adj* **1.** uzunqulaq *(adət. heyvan haq.);* **2.** eşşək, eşşək kimi *(adam haq.)*

**long-haired** ['lɔŋ'heəd] *adj* uzunsaç; **a ~ girl** uzunsaç qız

**longing** ['lɔŋgɪŋ] *adj* davamlı, sürəkli, uzun müddət davam edən; **a ~ look** davamlı baxış

**longevity** [lɔŋ'dʒevətɪ] *n* uzunömürlülük

**longitude** ['lɔŋ'dʒɪtju:d] *n* uzunluq *(en dairəsi)*

**longitudinal** [ˌlɔŋdʒɪ'tju:dɪnl] *adj* uzununa; uzunlamasına; boyu uzunu

**long-suffering** ['lɔŋ'sʌfərɪŋ] *adj* əzabkeşlik; dözümlülük, səbirlilik

**loo** [lu:] *n d.d.* ayaqyolu

**look¹** [luk] *n* baxış; nəzər; *He gave me a furious look O mənə qəzəblə baxdı; There was a look of suspicion in his eyes Onun baxışlarında şübhə var idi; We got some very odd looks Bizə çox qəribə nəzərlərlə baxdılar;* **to have a ~** nəzər yetirmək; baxmaq; *He had a look round the exhibition O, sərgiyə baxdı; I had a quick look at the paper Mən qəzeti ötəri gözdən keçirdim; They are having a look round the city Onlar şəhərdə gəzirlər;* **to have a ~ for** *smb./smth.* bir şeyi/kəsi axtarmaq; **2.** görünüş; *I don't like the look of him Mən onun görünüşünü xoşlamıram;* **by the ~ of things** şeylərin görünüşünə görə; *He has an excited look Onun çox həyəcanlı görünüşü var; He has a look of his father O, görünüş etibarı ilə atasına oxşayır; You can't go by looks İnsanları xarici görünüşünə görə mühakimə etməzlər; She was famous for her good looks O öz xarici gözəlliyi ilə məşhur idi*

**look²** [luk] *v* **1.** baxmaq; *I looked him straight in the eyes Mən birbaşa onun gözlərinə baxdım;* **2.** fikir vermək; baxmaq; *Look what you are doing Bax, gör nə edirsən/edirsiniz; The house looks the South Ev cənuba baxır;* **3.** görünmək; *You look well Sən/Siz yaxşı görünürsən /görünürsünüz; He looks foolish O, səfeh görünür; What does he look like? O nəyə/kimə oxşayır? He looks his age O, yaşına uyğun görünür; It looks like rain Deyəsən, yağış yağacaq; You don't look yourself Sən/Siz özünə/ özünüzə oxşamırsan/oxşamırsınız; It looks like salt to me Məncə, bu duzludur; He looks good in uniform O, formada yaxşı görünür, Forma ona yaraşır;* **to ~ about** boylanmaq; axtarmaq, soraqlaşıb tapmaq; *I am looking about a new job Mən təzə iş axtarıram;* **to ~ after** göz qoymaq, baxmaq; diqqət yetirmək; qulluq etmək; *I am looking after the children Mən uşaqlara baxıram; She looked after the plants O, bitkilərə qulluq etdi; Look after yourself Özündən /Özünüzdən muğayat ol/olun; He looks after himself when his wife is away Arvadı evdə olmayanda o özü-özünə qulluq edir;* **to ~ around** soraqlaşıb axtarmaq; *I am looking around for a new job Mən özümə təzə iş axtarıram/soraqlaşıram;* **to ~ at** baxmaq *(bir şeyə);* **to ~ away** gözünü çəkmək; **to ~ back** dönüb baxmaq; nəzər salmaq; *We looked back at the house Biz dönüb evə baxdıq;* **to ~ down 1)** aşağı baxmaq; *Don't look down Aşağı baxma/ baxmayın;* **2)** *məc.* yuxarıdan aşağı baxmaq; *They looked down on us Onlar bizə üstdən aşağı baxdılar;* **to ~ for** axtarmaq; *I am looking for my friend Mən dostumu axtarıram;* **to ~ for an opportu-**





**nity to do** *smth.* bir iş görmək üçün fürsət/imkan axtarmaq; **to ~ forward to** can atmaq; çox istəmək; *I am looking forward to the trip Mən həsrətlə səyahəti gözləyirəm;* **to ~ in on** baş çəkmək; *I looked in on her Mən ona dəydim /baş çəkdim;* **to ~ on 1)** müşahidə/seyr etmək; *They just stood and looked on Onlar sadəcə olaraq dayanıb müşahidə etdilər;* **2)** hesab etmək; *I have always looked on you as a friend Mən həmişə səni/sizi dost hesab etmişəm; They looked on me as a hero Onlar məni qəhrəman hesab etdilər;* **to ~ on to** baxmaq, açılmaq; *The window looks onto the park Pəncərə parka açılır/baxır;* **to ~ out 1)** axtarmaq; soraqlaşmaq; *I'll look out some clothes for him Mən ona paltar axtaracağam;* **2)** baxmaq *(içəridən bayıra);* diqqətli olmaq; *He looked out of the window O, pəncərədən başını çıxarıb bayıra baxdı; Look out, it's slippery Diqqətli ol/olun, yer sürüşkəndir;* **to ~ over 1)** baxmaq, yoxlamaq; nəzər salmaq; *The brakes need to be looked over Tormozları yoxlamaq lazımdır/ yoxlamağa ehtiyac var;* **2)** bir şeyin üzərindən baxmaq; *He looked over the fence O, hasarın üstündən (əyilib) baxdı; He looked over his shoulders O dönüb çiyninin üstündən baxdı;* **3)** nəzərdən/gözdən keçirmək; *He looked over an article O, məqaləni gözdən keçirdi;* **to ~ through** baxmaq *(bir şeyin arasından); He looked through glasses O, durbinlə baxdı;* **to ~ to** müraciət etmək; *I looked to him for help Mən ona kömək üçün müraciət etdim;* **to ~ up 1)** aşağıdan yuxarıya baxmaq; axtarmaq; *Look the word up in the dictionary O sözü lüğətdə axtar/axtarın; He looked up from his book O, gözünü kitabdan çəkib yuxarı baxdı;* gözünü yuxarı dikmək; *They were looking up at the sky Onlar gözlərini səmaya zilləmişdilər;* **2)** *məc.* düz məcraya yönəlmək; yaxşı getmək; *Things are looking up İşlər yaxşı gedir*

**looking-glass** ['lukɪŋgla:s] *n* güzgü, ayna

**look-out** ['lukaut] *n* **1.** müşahidə məntəqəsi; **2.** ayıqlıq, ehtiyatlılıq; sərvaxtlıq; **3.** gözləmə; ümid bəsləmə; *It's a poor look-out for the harvest Məhsul üçün ümid azdır; That is his look-out Bu onun ümid yeridir*

**loom¹** [lu:m] *n* saphörən maşın/dəzgah/qurğu

**loom²** [lu:m] *v* qəflətən peyda olmaq; *A ship loomed out of the fog Qəflətən dumanın içindən bir gəmi peyda oldu*

**loon** [lu:n] *n* I *zool.* qaqara *(şimalda yaşayan su quşu)*

**loon** [lu:n] *n* II **1.** yonulmamış adam; kənd adamı; **2.** yaramaz, dələduz, veyl; **3.** fahişə; pozğun, qəhbə; **4.** məşuqə

**loop¹** [lu:p] *n* ilmə *(ipdə);* halqa; kəmənd; *The river makes a loop round the village Su kəndin ətrafını əhatə edir*

**loop²** [lu:p] *v* **1.** ilmələmək, ilmə vurmaq; **2.** kəmənd atmaq; **3.** ilmə ilə bərkitmək; düyünləmək; düyün salmaq; **to ~ the loop** düyün düyünləmək; düyün salmaq

**loophole¹** ['lu:phoul] *n* **1.** *hərb.* mazğal, qala bacası; döyüşdə partlayışdan qorunmaq üçün çala/çuxur; **2.** əl yeri; boşluq; *(qanunda); I left myself a loophole Mən özümə bir əl yeri qoydum*

**loophole²** ['lu:phoul] *v hərb.* mazğal/çala/çuxur düzəltmək

**loopy** ['lu:pɪ] *adj* **1.** həncaməli; rəzəli; **2.** hiyləgər, kələkbaz, məkrli, iblis, şeytan

**loose¹** [lu:s] *adj* **1.** boş, sərbəst; azad; *That dog is too dangerous to be left loose O iti açıq buraxmaq çox təhlükəlidir/qorxuludur;* **to break/ to get ~** qaçmaq; aradan çıxmaq; *One of the tigers in the zoo has broken/got loose Zooparkdakı pələnglərdən biri açılıb qaçıb;* **2.** enli; böyük; laxlayan; **~ fitting clothes** gen paltar; **a ~ tooth** laxlayan diş; **3.** boş-boş danışıq; idarə edilməyən; nəzarətsiz; **to lead a ~ life** mənasız həyat sürmək, həyatını boş-boşuna keçirmək; **a ~ (= immoral) woman** əxlaqsız qadın, fahişə; **to be on the ~** *d.d.* başlı-başına buraxılmaq; **to play fast and ~ with** *smb.* bir kəsi aldatmaq, bir kəsə kələk gəlmək; **4.** qeyri-ciddi; qeyri-dəqiq *(tərcümə haq.),* orijinala uyğun gəlməyən; təhrif edilmiş şəkildə; **5.** yığcam olmayan; dağınıq; pərakəndə, əndazəsiz, əndazədən çıxan; **~ limbs** əndazəsiz/ əndazədən çıxan qol/qıç;

◊ *He has a screw loose Onun başı çatmır, Onun başında bir vint çatmır;* **to have a ~ tongue** ağzına nə gəldi danışmaq, dili uzun olmaq; **at a ~ end** əli boş, işsiz

**loose²** [lu:s] *v* açmaq, boşaltmaq; sərbəstləşdirmək; *Wine loosed his tongue Şərab onun dilini açdı*

**loosely** ['lu:slɪ] *adv* azad, azad surətdə; sərbəst, sərbəst şəkildə; gen-bol

**loosen** ['lu:sn] *v* **1.** boşaltmaq, sərbəst etmək; açmaq; **to ~ the screw** vinti boşaltmaq/ açmaq; **2.** yumşaltmaq; *This medicine may loosen your cough Bu dərman sənin/sizin öskürəyini/ öskürəyinizi yumşaldar;* **3.** boşalmaq; *The screw has loosened Vint boşalıb*

**loose up** ['lu:sʌp] *v id.* əl-qolunu açmaq

**loot¹** [lu:t] *n* qənimət

**loot²** [lu:t] *v* talamaq, talan etmək; *The brutal soldiers looted and massacred the town for three weeks Vəhşi əsgərlər üç həftə ərzində şəhəri taladılar*

**looter** ['lu:təʳ] *n* talançı; soyğunçu

**lop¹** [lɔp] *adj* sallaq

**lop²** [lɔp] *v* **(-pp-)** I kəsib atmaq; budamaq *(ağacı və s.)*

**lop** [lɔp] *v* **(-pp-)** II **1.** aşağı sallanmaq; **2.** yöndəmsiz yerimək, axsamaq

**lope** [loup] *v* hoppana-hoppana getmək
**lop-eared** [ˌlɔp'ɪəd] *adj* sallaqqulaq; ~ **rabbit** sallaqqulaq dovşan
**lopsided** ['lɔpsaɪdɪd] *adj* bir tərəfə sallanmış; çəp; əyri
**loquacious** [lə'kweɪʃəs] *adj* söhbətcil, çoxdanışan; uzunçu, çərənçi
**loquaciously** [lə'kweɪʃəslɪ] *adv* boşboğazlıqla, çərənçiliklə
**loquaciousness** [lə'kweɪʃəsnɪs] *n* dil boğaza qoymama; çox danışma; söhbətcillik, uzun-uzadı danışma, uzunçuluq
**loquacity** [lə'kwæsɪtɪ] *n* çox danışma; dil-dil ötmə, dil boğaza qoymama
**lord**[1] [lɔ:d] *n* **1.** lord; **the Lord = God**; *Christ. Lord! Lord knows! Allah bilir!* **the Lord's Day** bazar günü; **the ~'s supper** İsa peyğəmbərin 12 tərəfdarı ilə (imamlarla) ölümündən qabaq çörək yeyib şərab içməsi; **The House of Lords** Lordlar palatası; **2.** inzibati vəzifə tutan şəxs; **the Lord mayor of London** Londonun meri; **My lord** *yüksək vəzifə sahiblərinə hörmət mənasında işlədilən müraciət forması*
**lord**[2] [lɔ:d] *v* idarə etmək/olunmaq, ağalıq etmək; **to be ~ed over** idarə olunmaq/edilmək; *I will not be lorded", she said to her husband "Sən mənim üzərimdə ağalıq edə bilməzsən" – o, ərinə dedi*
**lordless** ['lɔ:dlɪs] *adj* ağasız
**lordliness** ['lɔ:dlɪnɪs] *n* alicənablıq; zadəganlıq; böyüklük
**lordly** ['lɔ:dlɪ] *adv* **1.** lovğa, lovğa-lovğa, təkəbbürlü; dikbaş; **2.** lordlara layiq
**lordship** ['lɔ:dʃɪp] *n* üsuli-idarə; idarəçilik;
◊ **His/Your lordship** *lorda müraciət etdikdə və ya lord haqqında danışdıqda işlədil*
**lore** [lɔ:ʳ] *n* keçmişdən miras qalmış bilik; **folk ~** folklor
**lorgnette** [lɔ:'njet] *n* **1.** uzun dəstəkli eynək; **2.** teatr binoklu
**lorry** ['lɔrɪ] *n* yük maşını; yükdaşıyan maşın
**lose** [lu:z] *v* **1.** itirmək; **to ~ a friend/a leg/interest** dost/qıç/marağ itirmək; *He lost his sight O, görmə qabiliyyətini itirdi; She lost her looks O öz görkəmini itirdi; I've lost my spectacles somewhere Mən harada isə eynəyimi itirmişəm; There is not a moment to lose Bir dəqiqə də belə itirmək olmaz; The watch loses a minute a day Saat gündə bir dəqiqə geri qalır;* **to ~ sight of** *smth.* bir şeyi gözdən itirmək; **to ~ oneself** özünü itirmək; *He loses himself in his work O, işin içində batır;* **to ~ one's temper** hövsələsini itirmək; *He lost his temper/his head O, hövsələsini/başını itirdi; I shan't lose my sleep over it Mən bu işə görə yuxumu itirməyəcəm;* **to ~ weight** arıqlamaq; *I must lose my weight Mən arıqlamalıyam;* **2.** batmaq; itmək; yoxa çıxmaq; *The crew was saved, but the ship was lost Heyət xilas edildi, lakin gəmi batdı; They were given up for lost Onlar itkin düşmüş hesab edildi; All is lost Hər şey əldən getdi/məhv oldu/itirildi; The joke was lost on him Zarafat ona çatmadı, O, zarafatı başa düşmədi;* **3.** uduzmaq *(oyunu, döyüşü və s.)*; **to ~ a game** oyunu uduzmaq; **to ~ a war/battle** müharibəni/ döyüşü uduzmaq; *We lost 3-6 Biz 3-6 hesabı ilə uduzduq*
**loser** ['lu:zəʳ] *n* **1.** uduzan adam; *He is a bad loser O, uduzmağı bacarmır/xoşlamır;* **2.** *id.* məğlub olmuş adam
**loss** [lɔs] *n* **1.** itki; **~ of blood** qan itirmə; **~ of memory** yaddaşın itməsi; **~ of strength** gücün itməsi (tükənməsi); **~ of temperature** hərarətin düşməsi; **to suffer ~es** itkilərə məruz qalmaq; *The army suffered heavy losses Ordu ağır itkilərə məruz qaldı;* **without ~ of time** vaxtı itirmədən; **to be at a ~** özünü itirmək; *He is never at a loss O heç vaxt özünü itirmir;* **2.** zərər; ziyan; **to sell at a ~** zərərinə satmaq
**lost**[1] [lɔst] *adj* itirilmiş; **a ~ opportunity/time** itirilmiş imkan/vaxt;
◊ *A lost time is never found again at. söz. Keçən günü geri qaytarmaq olmaz ≅ Keçənə güzəşt deyərlər;* **a ~ property office** itirilmiş şeylərin tapılıb saxlanıldığı idarə
**lost**[2] [lɔst] **to lose** *felinin pt, pp formaları*
**lot**[1] [lɔt] *n* **I 1.** püşk; **by ~** püşklə, püşkə görə; **to cast ~s** püşk atmaq; *They drew lots as to who should begin Onlar kimin başlamasını müəyyənləşdirmək üçün püşk atdılar; The lot fell on me Püşk mənə düşdü;* **2.** *məc.* qismət; tale; bəxt; *It fell to my lot to do this job Bu işi görmək mənim bəxtimə düşdü; I threw in my lot with her Mən öz taleyimi onunla bağladım;* **3.** partiya; *The goods were sent in three lots Mallar üç partiyada göndərildi;* **4.** *məc.* yaramaz; *He is a bad lot O çox yaramaz adamdır;* **5.** torpaq sahəsi; **a vacant ~** boş torpaq sahəsi; **6.** *amer.*: **a parking ~** maşın dayanacağı/parkı
**lot** [lɔt] *n* **II 1.** çox *(say, kəmiyyət)*; **a ~ of books** çoxlu sayda kitab; **a ~ of roses** çoxlu sayda gül; *They haven't got a lot of money Onların çoxlu pulları yoxdur; We have got such a lot to do Bizim çoxlu görüləsi işimiz vardır; They have lots and lots of money Onların külli miqdarda pulları vardır;* **2.** *d.d.* **(the ~)** hər şey, hamısı; *That's the lot Bu hər şeydir; Take the lot Hər şeyi götür/götürün; Get out, the lots of you! Hamınız buradan rədd olun! There was champagne, caviar, the lots Orada şampan, kürü və hər şey var idi*
**lot**[2] [lɔt] *adv* çox, çox-çox; tez-tez; *We don't see a lot of her now İndi biz onu tez-tez görmürük; I read a lot Mən çox oxuyuram; We don't go out a lot Biz tez-tez gəzməyə getmirik; Things have changed a lot İşlər xeyli/çox dəyişib*



**lotery** ['lɔtərɪ] *n* lotereya
**lotion** ['louʃn] *n* losyon
**loud** [laud] *adj* uca; bərk; **a ~ voice** uca/bərk səs
**loudly** ['laudlɪ] *adv* ucadan, hündürdən, bərkdən; **to speak ~** bərkdən/ucadan danışmaq
**loudness** ['laudnɪs] *n* ucalıq; yüksəliş *(səs haq.)*
**loud speaker** ['laudspi:kəʳ] *adj* reproduktor *(ucadan danışan aparat)*; **a ~ van** səsyayan maşın
**lounge**[1] ['laundʒ] *n* **1.** qonaq evi; **2.** tənbəl yeriş
**lounge**[2] ['laundʒ] *v* veyllənmək; söykənmək *(divara; qapıya və s.)*
**lounger** ['laundʒəʳ] *n* işsiz, avara, veyl
**lour** [lauəʳ] *v* tərs-tərs baxmaq; gözünü ağartmaq; qaş-qabağını tökmək
**louse** [laus] *n* **1.** *(pl* **lice** [laɪs]) bit *(həşərat)*; **2.** *sl.* iyrənc adam; *He is an absolute louse O çox iyrənc adamdır*
**lousiness** ['lauzɪnɪs] *n* bitlilik
**lousy** ['lauzɪ] *adj* **1.** bitli; **2.** *d.d.* alçaq, iyrənc, saxta;
◊ **to be ~ with money** çox pullu/varlı olmaq
**lout** [laut] *n* kobud adam
**lovable** ['lʌvəbl] *adj* xoşagələn, istəkli
**love**[1] [lʌv] *n* **1.** məhəbbət; sevgi; *She shows no love for her child O, uşağına məhəbbət bəsləmir;* **~ at first sight** ilk baxışdan sevgi; **for the ~ of the thing** işə olan məhəbbətə görə; **to be in ~ with** *smb.* bir kəsi sevmək; **to fall in ~ with** *smb.* bir kəsə vurulmaq; **~ of money** pul sevgisi, pula hərislik; **to give/to send** *smb.* **one's ~** bir kəsə sevgisini/məhəbbətini göndərmək; **for the ~ of God** Allah eşqinə/naminə/xatirinə; *Put that gun down for the love of God Allah xatirinə o silahı yerə qoy/qoyun;* **2.** *ailədə əzizləyici söz kimi*: əzizim; gözümün işığı; *Hurry up, love Tələs, əzizim; He is ill, poor love Gözümün işığı/ Ciyərparam xəstədir;* **3.** salam; *Give them my love Mənim salamımı onlara yetir/yetirin;* **4.** *id.* heç-heçə; sıfır; **~ all** heç-heçə; **one ~ to him** bir sıfır onun xeyrinə
**love**[2] [lʌv] *adj* eşq, sevgi, məhəbbət; **~ affair** eşq macərası; **~ letter** məhəbbət məktubu
**love**[3] [lʌv] *v* sevmək; **to ~ one's parents/one's country/one's wife/one's husband** valideynlərini /ölkəsini/arvadını/ərini sevmək; *The Koran tells us to love all men Quranda deyilir ki, bütün insanları sevmək lazımdır;*
◊ *Love me, love my dog at. söz. Məni sevirsən, itimi də sev ≅ İtə hörmət edərlər yiyəsinə görə; I'd love to... Çox istərdim ki...*
**loveliness** ['lʌvlɪnɪs] *n* sevimlilik; istəklilik, xoşagələnlik, qəşənglik
**lovely** ['lʌvlɪ] *adj* xoş; xoşagələn, qəşəng, gözəl; **a ~ view** xoş mənzərə; **a ~ child** qəşəng uşaq; **a ~ woman** gözəl qadın; **~ weather** gözəl/xoş hava; *We had a lovely holiday Biz gözəl bayram keçirtdik*
**lover** ['lʌvəʳ] *n* **1.** məşuq; *She took a lover O özünə məşuq tapdı;* **a pair of ~s** sevgililər, məşuqlar; **2.** həvəskar; **a music ~** musiqi həvəskarı
**loving** ['lʌvɪŋ] *adj* sevən, aşiqanə, istəkli; məhəbbətli; **a ~ glance** aşiqanə baxış; **~ words** aşiqanə sözlər; *Your loving friend... Sənin/Sizin səmimi dostun/dostunuz (məktubda)*
**low**[1] [lou] *n* movuldama *(inək)*
**low**[2] [lou] *adj* aşağı, alçaq; **a ~ price/wage** aşağı qiymət/maaş; **a ~ wall** alçaq divar; **a ~ attendance** aşağı davamiyyət; **a ~ whisper** alçaq/yavaş pıçıltı; **~ class** aşağı sinif; **~ Chamber/House** aşağı palata; *The moon is low in the sky Göydə ay aşağı enib*
**low**[3] [lou] *v* movuldamaq *(inək)*
**low-down**[1] ['loudaun] *adj* alçaq, şərəfsiz; **to play a ~ trick** şərəfsiz hiylə/məkr işlətmək; **2.** kobud; **3.** təfsilat, incəlik; *He gave me the low-down on that case Bu məsələdə o mənə bütün məlumatı incəliklərinə qədər verdi*
**low-down**[2] ['loudaun] *adv* şərəfsizcəsinə, şərəfsiz, ləyaqətsiz; **to play it ~** özünü şərəfsiz/ləyaqətsiz aparmaq
**lower**[1] [louəʳ] *adj* alt, aşağı; **the ~ classes** aşağı siniflər; **a ~ tooth** alt diş
**lower**[2] [louəʳ] *v* **1.** aşağı salmaq/dikmək/düşmək /enmək; *She lowered the blinds O, pərdələri aşağı saldı; She lowered her eyes/her head O, gözünü yerə dikdi/başını aşağı saldı; He lowered himself by the rope O, kəndirlə aşağı düşdü/endi;* **2.** aşağı salmaq; endirmək; **to ~ prices** qiymətləri aşağı salmaq/ endirmək; **to ~ the temperature** hərarəti aşağı salmaq; **to ~ one's voice** səsinin aşağı salmaq; *I wouldn't lower myself to ask Mən özümü endirib xahiş etməzdim*
**low-grade** ['lou'greɪd] *adj* aşağı keyfiyyətli
**low-heeled** [ˌlou'hi:ld] *adj* alçaqdaban, alçaq dabanlı; **~ shoes** alçaqdaban/alçaq dabanlı ayaqqabı
**low-land** ['loulənd] *n* düzənlik, alçaq yer
**low-level** ['lou'levl] *adj* **1.** aşağı səviyyəli; **2.** *məc.* kiçik; **a ~ officer** kiçik məmur/zabit
**lowlife** ['loulaɪf] *n* aşağı həyat səviyyəsi, həyatın dibi
**low-paid** ['lou'peɪd] *adj* azmaaşlı, azməvacibli
**low-powered** ['lou'pauəd] *adj* azgüclü, gücü az olan
**loyal** ['lɔɪəl] *adj* **(to)** sədaqətli; sadiq, vəfalı; **~ to one's country** öz ölkəsinə sadiq/sədaqətli; **a ~ friend** sadiq /vəfalı dost
**loyalist** ['lɔɪəlɪst] *n* öz ağasına/hökmdarına sadiq olan şəxs
**loyalty** ['lɔɪəltɪ] *n* sadiqlik, vəfalılıq; bağlılıq
**lozenge** ['lɔzɪndʒ] *n* **1.** romb; **2.** dördkünc kristal formalı fiqur; **3.** tərkibində dərman olan ətirli həb; **cough ~s** öskürək dərmanı
**L-plate** ['elpleɪt] *n minik maşınının tədris məq-*

*sadilə istifadə edildiyini bildirmək üçün üzərində L hərfi olan lövhə*

**lubber** ['lʌbəʳ] *n* zırrama; heyvərə

**lubber-head** ['lʌbəhed] *n* yekəbaş, başıboş, kütbeyin

**lubricant** ['lu:brɪkənt] *n* yağlayıcı maddə, sürtkü materialı

**lubricate** ['lu:brɪkeɪt] *v* yağlamaq *(mühərriki, maşını, maşın hissələrini)*

**lubrication** [,lu:brɪ'keɪʃn] *n* yağlama, yağlanma

**luce** [lu:s] *n zool.* durnabalığı

**lucent** ['lu:sənt] *adj* parıldayan, bərq vuran, şəffaf

**lucerne** [lu:'sə:n] *n bot.* yonca

**lucid** ['lu:sɪd] *adj* 1. aydın; sadə; **a ~ explanation** aydın izahat; **a ~ literary style** aydın/sadə ədəbi üslub; 2. əqli cəhətdən sağlam; dərk edilən; anlaqlı; 3. *şair.* parlaq, sayrışan

**lucidity** ['lu:sɪdɪtɪ] *n* aydınlıq; sadəlik; anlaşıqlıq

**lucidly** ['lu:sɪdlɪ] *adv* aydın/anlaqlı/sadə şəkildə

**Lucifer** ['lu:sɪfəʳ] *n əs.* 1. Lyusifer *(şeytan, böyük məkr mələikəsi)*; 2. dan ulduzu

**luck** [lʌk] *n* imkan; təsadüf *(pis və ya yaxşı)*; **to have good/bad ~ in *one's* affairs** işlərində yaxşı/ pis imkana malik olmaq, işi gətirmək/ gətirməmək; *As luck would have it Allahın qismətilə; It was hard luck on you that... Sənə/ Sizə Allah qismət etmədi ki,...; What rotten/bad luck! Nə bədbəxtlik! Good luck! Uğur olsun! Yaxşı yol!*

**luckily** ['lʌkɪlɪ] *adv* xoşbəxtlikdən, bəxtəvərlikdən; *Luckily I was at home when he rang me up Xoşbəxtlikdən o mənə zəng edəndə mən evdə idim*

**lucky** ['lʌkɪ] *adj* bəxtigətirən; xoşbəxt, bəxtəvər; **to be ~** xoşbəxt/bəxtəvər olmaq

**lucrative** ['lu:krətɪv] *adj* sərfəli, faydalı, xeyirli

**lucre** ['lu:kəʳ] *n* pul qazanma *(dələduzluq yolu ilə)*

**ludicrous** ['lu:dɪkrəs] *adj* gülünc, gülməli

**ludicrously** ['lu:dɪkrəslɪ] *adv* məzəli, gülünc, gülünc/məzəli şəkildə

**ludo** ['lu:dou] *n* oyun növü *(stolüstü)*

**lues** [lju:i:z] *n tib.* sifilis *(zöhrəvi xəstəlik)*

**lug¹** [lʌg] *n* lövbər

**lug²** [lʌg] *v* dartıb aparmaq

**luge** [lu:dʒ] *n* qısa yelkənli qayıq

**luggage¹** ['lʌgɪdʒ] *n* baqaj; yük; **to get *one's* ~ through the customs house** baqajını/yükünü gömrükxanadan keçirmək

**luggage²** ['lʌgɪdʒ] *adj* baqaj, yük; **~ carrier** yükdaşıyan araba; **~ rack** baqaj qoyulan rəf; **~ van** baqaj qoyulan sandıq; **~ space** baqaj şöbəsi; **~ boot** avtomobilin yük yeri; **~ office** yük saxlama kamerası

**lugger** ['lʌgəʳ] *n* kiçik gəmi

**lugubrious** [lə'gu:brɪəs] *adj* kədərli; müdhiş; qəmli, pərişan, qüssəli, yaslı

**luke-warm** ['lu:k'wɔ:m] *adj* ılıq, ılıqtəhər; **~ water** ılıq/ılıqtəhər su; *Heat the milk until it's just luke-warm Südü ancaq ılıqtəhər olanadək qızdır/qızdırın*

**lull¹** ['lʌl] *n* sakitlik, rahatlıq; **a ~ in the storm/conversation** fırtınanın/söhbətin sakit məcraya düşməsi

**lull²** ['lʌl] *v* 1. səngimək, yatmaq, sakitləşmək; *The wind lulled Külək səngidi/yatdı; The sea lulled Dəniz sakitləşdi*; 2. yatırtmaq; **to ~ a baby to sleep** uşağı yatırtmaq

**lullaby** ['lʌləbaɪ] *n* laylay *(uşağı yatırtmaq üçün oxunan şirin mahnı)*

**lumbago** [lʌm'beɪgou] *n tib.* lümbaqo *(bel ağrısı)*

**lumbar** ['lʌmbəʳ] *n anat.* çanaq; bel

**lumber¹** ['lʌmbəʳ] *n* 1. meşə materialı, ağac, taxta-şalban *(yonulmamış)*; 2. köhnə/sınıq-salxaq mebel; 3. cır-cındır, zir-zibil, dəyərsiz şeylər; 2. zibil, tullantı

**lumber²** ['lʌmbəʳ] *v* 1. guruldamaq, gurultu/şaqqıltı ilə getmək *(həm də* **to ~ aling/by/past**); *The heavy trucks lumbered by/past Ağır yük maşınları gurultu ilə keçib getdi;* 2. ağır-ağır getmək

**lumberer** ['lʌmbərəʳ] *n* = **lumbeman**

**lumbeman** ['lʌmbəmən] *(pl* **-men** [-mən]) *n* 1. meşə qıran, ağackəsən *(fəhlə)*; 2. odunçu, odunsatan

**lumber room** ['lʌmbəru:m] *n* zibilxana; kiçik anbar, anbarcık

**luminary** ['lu:mɪnərɪ] *n* 1. işıq saçan hər hansı bir səma cismi; 2. parlaq, işıq saçan insan, çoxbilən *(adam)*; müdrik insan

**luminosity** [,lu:mɪ'nɒsɪtɪ] *n* parlaqlıq; işıqlılıq

**luminous** ['lu:mɪnəs] *adj* 1. işıqsaçan; parlaq; 2. *məc.* aydın, asan, başadüşən; **a ~ speaker** aydın danışan natiq

**lump¹** [lʌmp] *n* 1. tikə; parça; **a ~ of sugar** bir tikə qənd; **a ~ of ice/stone** bir parça buz/daş; 2. *məc.* iri məbləğ; *It was paid in a lump sum O, iri məbləğlə ödənildi*; 3. şiş; **a ~ on *one's* knee** dizində şiş; *He has a lump on his forehead Onun alnında şiş var*

**lump²** [lʌmp] *v* toplamaq; cəm etmək, cəmləmək; **to ~ together** bir yerə cəm etmək/cəmləmək

**lumpy** ['lʌmpɪ] *adj* 1. kəsəkli, nahamar, dübürdübür; 2. təlatümlü; **~ sea** təlatümlü dəniz

**lunatic¹** ['lu:nətɪk] *n* lunatik, gic, axmaq *(adam)*; *You're driving on the wrong side of the road, you lunatic! Ay axmaq, sən yolun əks tərəfi ilə sürürsən (yol hərəkətinin əksinə)*

**lunatic²** ['lu:nətɪk] *adj* dəli; lunatik, ruhi xəstə, malxülya; **~ proposal** axmaq təklif

**lunatic asylum** dəlixana *(ruhi xəstələr üçün)*

**lunch¹** [lʌntʃ] *n* günorta yeməyi; qəlyanaltı; **to have/to take ~** qəlyanaltı etmək

**lunch²** [lʌntʃ] *v* 1. qəlyanaltı etmək; 2. *d.d.* qəlyanaltıya qonaq etmək



**lunch box** ['lʌntʃbɒks] *n* səhər yeməyi qoyulan qutu *(məktəbli və s. üçün)*

**lunch counter** ['lʌntʃ,kauntəʳ] *n* bufet; ərzaq satılan piştaxta

**luncheon** ['lʌntʃən] *n* səhər yeməyi *(adət. rəsmi)*

**luncheonette** [,lʌntʃə'net] *n* 1. *amer.* yüngül qəlyanaltı kafesi; 2. yüngül qəlyanaltı

**luncheon voucher** ['lʌntʃən,vautʃəʳ] *n* yemək üçün talon *(müəssisə tərəfindən fəhlələrə verilən)*

**lunch-hour** ['lʌntʃ,auəʳ] *n* ikinci səhər yeməyi saatı/vaxtı

**lunch-room** ['lʌntʃru:m] *n amer.* qəlyanaltı *(yer)*

**lunch-time** ['lʌntʃtaɪm] *n* = **lunch-hour**

**lunette** [lu:'net] *n* 1. *hərb.* səhra istehkamı; 2. təbil; dəf; 3. *mem.* timpan *(binanın heykəllər və s. ilə bəzədilmiş qabaq hissəsi)*

**lung** [lʌŋ] *n anat.* ağ ciyər; **the ~s** ağ ciyərlər; **inflammation of the ~s** ağ ciyərlərin sətəlcəmi; ◊ **good ~s** güclü səs; **at the top of *one's* ~s** gur/uca səslə; **~s of London** Londonun park və xiyabanları

**lunge¹** [lʌndʒ] *n* I 1. korda *(at təlimində işlədilən uzun ip, qırmanc)*; 2. atın təlimində istifadə edilən dairə/meydan

**lunge** [lʌndʒ] *n* II təkan, sıçrayış; irəli sıçrayış/hoppanma

**lunge²** [lʌndʒ] *v* 1. irəli sıçramaq/hoppanmaq; 2. çiyindən aşağı zərbə endirmək

**lung cancer** ['lʌŋ'ka:nsəʳ] *n tib.* ağ ciyərlərin xərçəngi

**lung fever** ['lʌŋ'fi:vəʳ] *n tib.* ağ ciyərlərin iltihabı

**lung-tester** ['lʌŋ,testəʳ] *n tib.* spirometr *(ağ ciyərlərin tutumunu ölçən cihaz)*

**lungwort** ['lʌŋwə:t] *n bot.* ballıca *(öfkəotu)*

**lupine** ['lu:pi:n] *n bot.* lupin, acı paxla

**lupus** ['lu:pəs] *n tib.* dəri vərəmi

**lurch¹** [lə:tʃ] *n* I dar gün; çətin an; dar ayaq; **to leave *smb.* in the ~** bir kəsi dar ayaqda qoyub getmək/qaçmaq

**lurch** [lə:tʃ] *n* II tarazlığın pozulması/əyilməsi

**lurch²** [lə:tʃ] *v* 1. əyilmək; 2. səndələmək; səndələyə-səndələyə getmək; *A drunk lurched along the street Sərxoş küçə ilə səndələyə-səndələyə getdi*

**lurcher** ['lə:tʃəʳ] *n* 1. iybilən it; iyləyərək/iy götürərək axtaran it; 2. fırıldaqçı, cibgir, oğru

**lure¹** [ljuəʳ] *n* 1. şirnikləndirmə, cəlb etmə; 2. yem, tələ yemi *(balıq, siçan və s. tutmaq üçün)*

**lure²** [ljuəʳ] *v* salmaq, tələyə düşmək; tora salmaq; *The spider lured the fly into its web Hörümçək milçəyi öz toruna saldı; They were lured into a trap Onlar tələyə düşdülər*

**lurk** [lə:k] *v* gizlənmək; yuva salmaq; *He is lurking in the bushes O, kolluqda gizlənir; Suspicion still lurked in his mind Şübhə hələ də onun beynində yuva salmışdı*

**luscious** ['lʌʃəs] *adj* şirəli; təravətli

**lush¹** [lʌʃ] *n* 1. spirtli içki; 2. *sl.* əyyaş

**lush²** [lʌʃ] *adj* şirəli, sulu; gur *(bitki haq.)*

**lust** [lʌst] *n* həvəs, şəhvət, ehtiras; istək, seks

**lustful** ['lʌstfl] *adj* şəhvətli, ehtiraslı; **~ glances** şəhvətli/etiraslı baxışlar

**lustre** ['lʌstəʳ] *n* 1. parıltı; bərq, bərq vurma; 2. şöhrət; **to add/to give ~ to *smth.*; to throw/to shed ~ on *smth.*** 1) bir şeyi işıqlandırmaq/ parıldatmaq; 2) bir şeyi şöhrətləndirmək

**lustrous** ['lʌstrəs] *adj* parlaq, işıqlı, bərq vuran, parıltılı, parıldayan; **~ black hair** parlaq qara saç

**lustrum** ['lʌstrəm] *n* *(pl* **-tra, -trums** [trəmz]) beşillik

**lusty** ['lʌstɪ] *adj* sağlam, güclü, möhkəm; **a ~ voice** güclü səs; **a ~ infant** sağlam uşaq

**lute** [lju:t] *n* zamaska, zamaska ilə suvama

**lux** [lʌks] *n fiz.* lüks *(işıqlandırma vahidi)*

**luxate** ['lʌkseɪt] *v* çıxartmaq; burxutmaq *(qolu, qıçı)*

**luxation** [lʌk'seɪʃn] *n* burxulma; çıxma *(qol, qıç haq.)*

**luxe** [lʌks] *n* cah-calal, zənginlik, təmtəraq

**luxuriant** [lʌg'zju:rɪənt] *adj* 1. varlı, zəngin, aşıb-daşan, gur; **~ imagination** zəngin təəssürat; **~ growth** gur yetişmə, sürətlə boy atma; 2. parlaq *(üslub haq.)*; **a ~ style** parlaq üslub

**luxuriate** [lʌg'zjuərɪeɪt] *v* 1. var-dövlət içində üzmək; 2. ləzzət almaq; kef çəkmək/görmək; 3. sürətlə boy atmaq/böyümək

**luxurious** [lʌg'zjuərɪəs] *adj* 1. zəngin, varlı, cahcalallı, təmtəraqlı; 2. zənginlik sevən, təmtəraq hərisi olan

**luxury** ['lʌkʃərɪ] *n* 1. cah-calal, var-dövlət; zənginlik; 2. həzz; böyük ləzzət/məmnunluq; **the ~ of a good book** yaxşı kitabdan alınan həzz/ ləzzət/məmnunluq

**lye** [laɪ] *n kim.* torta; qələvi

**lying¹** ['laɪɪŋ] **to lie** *felinin pr. p forması*

**lying²** ['laɪɪŋ] *adj* yalan, yalan danışan/uyduran; **a ~ man** yalan danışan/uyduran adam

**lying-in¹** [,laɪɪŋ'ɪn] *n* doğma, doğuş

**lying-in²** [,laɪɪŋ'ɪn] *adj* doğan, doğum; **~ hospital** doğum evi

**lymph** ['lɪmf] *n fiziol.* limfa; **animal ~** peyvənd, vaksin

**lymphatic** [lɪm'fætɪk] *adj* 1. *fiziol.* limfa, limfaya aid olan; 2. arıq, cansız, zəif; cılız; 3. fleqmatik, süst, ölüvay; 4. solğun, rəngsiz, rəngi qaçmış

**lymph gland** ['lɪmfglænd] *n* limfa vəzisi

**lynch** [lɪntʃ] *v* linclәmәk, linc mühakiməsi ilə cəzalandırılmaq, daş-qalaq etmək, vəhşicəsinə divan tutmaq

**lynch law** ['lɪntʃlɔ:] *n* linc qanunu/məhkəməsi, daş-qalaq etmə, vəhşicəsinə divan tutma

**lynx** [lɪŋks] *n zool.* vaşaq, yazıpişiyi

**lynx-eyed** [,lɪŋks'aɪd] *adj* itigözlü, gözü iti görən

**lyra** [ˈlaɪrə] *n* **1.** lira *(qədim yunanlarda simli musiqi aləti)*; **2.** *astr.* lira *(bürc)*
**lyre** [laɪəʳ] *n* lirə *(İtaliyada, Türkiyədə pul vahidi)*; **Turkish ~** türk lirəsi
**lyrebird** [ˈlaɪəbə:d] *n zool.* liraquyruq *(quş)*
**lyric** [ˈlɪrɪk] *adj* **1.** lirik; **~ poetry** lirik poeziya, lirika; **2.** lirik şer
**lyrical** [ˈlɪrɪkəl] *adj* lirik; **~ poet** lirik şair; **~ verses** lirik şerlər
**lyricism** [ˈlɪrɪsɪzəm] *n* liriklik, lirika
**lyrics** [ˈlɪrɪks] *n* lirik şerlər, lirika
**lyrist** [ˈlaɪərɪst] *n* I lira musiqi alətində çalan adam, liraçı
**lyrist** [ˈlaɪərɪst] *n* II lirik, lirik şerlər müəllifi
**lysis** [ˈlaɪsɪs] *n tib.* lizis *(yoluxucu xəstəliklər zamanı hərarətin tədricən enməsi)*



# Mm

**M m** [em] *n (pl* **M's, m's** [emz]) *ingilis əlifbasının 13-cü hərfi*
**M** [em] *n* I 1000 sayını bildirən rum rəqəmi
**M** [em] *n* II **Monsieur** *isminin qısa forması*
**M** [em] *n* III **male, mile (mil)** *və ya* **minute** *(dəqiqə) sözlərinin qısa forması*
**M** [em] *n* IV **metre** *və ya* **metres** *isimlərinin qısa forması*
**ma** [ma:] *n d.d.* **= mother**
**M.A.** [em eɪ] *n* **Master of Arts** magistr dərəcəsi *(humanitar elmlər üzrə)*
**maam** [mæm] *n d.d.* madam
**macabre** [məˈkæbr] *adj* qüssəli, qəmli; kədərli, kinayəli, ürəksıxan; dəhşətli, müdhiş; **~ humour** kinayəli yumor
**macadam**[1] [məˈkædəm] *n* **1.** çınqıl; **2.** çınqıl döşənmiş yol
**macadam**[2] [məˈkædəm] *adj* çınqıl tökülmüş; **a ~ road** çınqıl tökülmüş yol
**macadamize, -ise** [məˈkædəmaɪz] *v* yola çınqıl tökmək
**macadamizing, -ising** [məˈkædəmaɪzɪŋ] *n* yola çınqıl tökmə
**macaroni** [ˌmækəˈrounɪ] *n* makaron
**macaroon** [mækəˈru:n] *n* badamlı peçenye
**macaw** [məˈkɔ:] *n* makao *(Amerikanın tropik hissəsində yaşayan iri uzunquyruqlu tutuquşu növü)*
**mace** [meɪs] *n tar.* toppuz, gürz
**macerate** [ˈmæsəreɪt] *v* isladıb yumşaltmaq; islanıb yumşalmaq
**Mach** [ma:k] *n* sürət ölçüsü *(təyyarənin səsin sürətinə nisbətdə sürəti)*
**machete** [məˈtʃetɪ] *n* **1.** kristal; **2.** enli bıçaq *(hinduların silah kimi işlətdikləri)*
**Machiavellian** [ˌmæˈkɪəˈvelɪən] *adj* **1.** Makiavelli sayağı *(nə istədiyini bilmədən müəyyən işlərə baş vuran)*; **2.** vicdansız
**machine**[1] [məˈʃi:n] *n* **1.** dəzgah; **drilling ~** deşikaçan dəzgah; **2.** *d.d.* maşın; **sewing ~** tikiş maşını; **knitting ~** toxuyucu maşın; **3.** *məc.* aparat; **party ~** partiya aparatı
**machine**[2] [məˈʃi:n] *adj* maşın; **~ shop** maşın sexi; **~ tool** maşın dəzgahı
**machine**[3] [məˈʃi:n] *v* maşınla tikmək
**machine gun** [məˌʃi:nˈgʌn] *n* pulemyot
**machinery** [məˈʃi:nərɪ] *n* mexanizm, maşın avadanlığı
**machine-shop** [məˈʃi:nʃɔp] *n* maşınqayırma zavodu
**machine-tool** [məˈʃi:ntu:l] *n tex.* dəzgah
**machinist** [məˈʃi:nɪst] *n* maşınqayırma mütəxəssisi; maşinist; mühəndis
**machismo** [məˈtʃɪzmou] *n* təkəbbür, lovğalıq, iddia
**mackerel** [ˈmækrəl] *n zool.* skumbriya *(balıq növü)*; **smoked ~** hisə verilmiş/hislənmiş skumbriya
**mackintosh** [ˈmækɪntɔʃ] *n* makintoş *(sukeçirməyən palto/plaş)*
**macrobiotic** [ˌmækroubaɪˈɔtɪk] *adj* uzunömürlü, uzun müddət yaşayan/qalan; **~ food** uzun müddət qalan ərzaq/ yeyəcək
**macrocosm** [ˈmækroukɔzəm] *n* kainat, aləm, dünya
**mad**[1] [mæd] *adj* **(-dder, -ddest) 1.** ruhi xəstə; dəli; **to drive *smb.* ~** bir kəsi dəli etmək; **to be ~ about *smb.*** bir kəsdən ötrü dəli-divanə olmaq; *He was mad with jealousy O, qısqanclıqdan dəli olmuşdur; What a mad thing to do! Bu ki dəlilikdir!* **2.** quduz; **a ~ dog** quduz it; **3.** qəzəbli; *He was hopping mad with me for being late Gecikdiyimə görə o lap dəli olmuşdu; Don't get mad at me Mənə qəzəblənmə/cinlənmə*
**mad**[2] [mæd] *adv* dəli kimi; dəlicəsinə; *He ran like mad O, dəli kimi qaçdı*
**madam** [ˈmædəm] *n d.d.* madam, xanım
**madame** [məˈda:m] *qadınların ərdə olduğunu bildirmək üçün onların adlarının qarşısında işlədilən müraciət*
**madcap** [ˈmædkæp] *n* şuluqçu, dəcəl, nadinc, dəlisov, azğın, qoçu
**madden** [ˈmædn] *v* **1.** dəli etmək, ağlını/huşunu başından almaq; dəli-divanə etmək; *She is maddening me O mənim ağlımı başımdan alır, O məni dəli/dəli-divanə edir*; **2.** əsəbiləşdirmək, özündən çıxartmaq, cinlətmək
**made**[1] [meɪd] **to make** *felinin pt, pp formaları*
**made**[2] [meɪd] *adj* düzəldilmiş, istehsal edilmiş, qayırılmış; **~ in Japan/in England/in Spain /in Italy, etc.** Yaponiyada/İngiltərədə/ İspaniyada /İtaliyada *və s.* düzəldilmiş/istehsaledilmiş
**madeira** [məˈdɪərə] *n* madera *(ağ şirin şərab)*
**mad-house** [ˈmædhaus] *n* dəlixana
**madly** [ˈmædlɪ] *adv* dəli kimi, dəlicəsinə; *He is madly jealous O dəlicəsinə qısqancdır; They are madly in love Onlar bir-birini dəlicəsinə sevirlər*
**madman** [ˈmædmən] *n (pl* **-men** [-mən]) dəli; ağılsız; divanə *(həm də məc.)*; **to shout like a ~** dəli kimi qışqırmaq
**madness** [ˈmædnɪs] *n* **1.** dəlilik; ağılsızlıq, divanəlik, ruhi pozğunluq; *It would be madness to go out in such a shower Belə leysanda bayıra çıxmaq dəlilik olardı*; **2.** quduzluq *(heyvanlarda)*
**Madonna** [məˈdɔnə] *n* Madonna *(İsa peyğəmbərin anası Məryəmin heykəli və ya şəkli)*

**madrigal** ['mædrɪgl] *n* şərqi, nəğmə *(çalğısız; xor üçün)*
**maelstrom** ['meɪlstrum] *n* 1. nəhəng burulğan; 2. *məc.* hadisələrin burulğanı; dağıdıcı qüvvə; ~ **of war** müharibənin dağıdıcı qüvvəsi
**maenad** ['mi:næd] *n* 1. Yunan mifologiyasında şərab allahı; 2. ağılsız qadın
**maestro** ['maɪstrou] *n* maestro
**maffick** ['mæfɪk] *v arx.* sevincdən atılıb/ hoppanıb düşmək
**mafia** ['mæfiə] *n* mafiya; **the** ~ Siciliyada gizli mütəşəkkil təşkilat; *The town mafia will prevent this plan from going through Şəhər mafiyası bu planın həyata keçməsinə mane olacaq*
**mag** [mæg] *n d.d.* **magazine** *isminin qısa forması*; **colour** ~**s** şəkilli jurnallar
**magazine**[1] [,mægə'zi:n] *n* 1. silah-sursat anbarı; 2. daraq *(tüfəngdə)*; 3. dövri jurnal *(həftəlik, aylıq və s.)*; **a literary** ~ ədəbi jurnal; **glossy** ~**s** dilçilik jurnalları
**magazine**[2] [,mægə'zi:n] *adj* jurnal; **a** ~ **article** jurnal məqaləsi; ~ **editor** jurnal redaktoru
**maggot** ['mægət] *n zool.* sürfə *(xüs milçəkdə)*
**magi** [meɪdʒaɪ] *n pl* sehrbazlar; cadugərlər, falçılar
**magic**[1] ['mædʒɪk] *n* 1. sehrkarlıq; möcüzə; ovsunlama; **black** ~ qara magiya; cadugərlik, ovsunçuluq; *The medicine worked like magic Dərman möcüzə yaratdı*; **the** ~ **of Shakespeare's poetry** Şekspir poeziyasının möcüzəsi; 2. *məc.* füsunkarlıq; **the** ~ **of the woods in autumn** payızda meşələrin füsunkarlığı; *I'll never forget the magic of that evening Mən o gecənin füsunkarlığını heç vaxt unutmayacağam*; 3. kələkbazlıq, oyunbazlıq
**magic**[2] ['mædʒɪk] *adj* 1. sehrli; **a** ~ **lamp** sehrli lampa; **a** ~ **trick** sehrli tryuk/ustalıq/məharət; 2. əla, çox yaxşı; **a** ~ **performance** əla/çox gözəl tamaşa
**magical** ['mædʒɪkl] *adj* sirli; möcüzəli; sehrli; ~ **powers** sirli qüvvələr
**magically** ['mædʒɪkəlɪ] *adv* möcüzəli/sirli/ sehrli şəkildə
**magician** [mə'dʒɪʃn] *n* 1. sehrbaz; cadugər, ovsunçu; gözbağlayıcı; 2. fokusçu *(fokuslar göstərən estrada/sirk artisti)*
**magisterial** [,mædʒɪs'tɪərɪəl] *adj* məhkəməyə/ məhkəmənin səlahiyyətinə aid olan
**magistrate** ['mædʒɪstreɪt] *n* 1. aşağı səviyyəli məhkəmədə hakim; 2. sülh carçısı
**magistracy** ['mædʒɪstrəsɪ] *n* hakimlik; polis məhkəməsi; **examining** ~ müstəntiq, silistçi; **the** ~ hakimlər kollegiyası
**magnanimity** [mægnə'nɪmɪtɪ] *n* əliaçıqlıq, səxavətlilik, mərdlik, alicənablıq, comərdlik
**magnanimous** [,mæg'nænɪməs] *adj* alicənab, mərd, səxavətli; əliaçıq; **a man** ~ **of soul** alicənab/səxavətli/əliaçıq adam
**magnanimously** [,mæg'nænɪməslɪ] *adv* səxavətlə, mərdcəsinə, comərdcəsinə, alicənablıqla

**magnate** ['mægneɪt] *n* maqnat; varlı adam; iri torpaq sahibi; mülkədar
**magnesia** [mæg'ni:ʃə] *n* maqneziya; maqnezium oksid *(toz halında)*
**magnesium** [mæg'ni:zɪəm] *n kim.* maqnezium
**magnet** ['mægnɪt] *n* 1. maqnit; 2. *məc.* yapışıqlı adam; qır-saqqız
**magnetic** [mæg'netɪk] *adj* 1. maqnit, maqnitli; ~ **field** maqnit sahəsi; **a** ~ **needle** kompasın əqrəbi *(cəhətləri göstərən)*; 2. *məc.* füsunkar, cəzbedici, cazibədar; **a** ~ **smile** cazibədar /füsunkar/cəzbedici təbəssüm; ~ **personality** cazibədar/cazibəli şəxsiyyət
**magnetically** [mæg'netɪklɪ] *adv* cazibədarlıqla; füsunkarlıqla, füsunkarcasına
**magnetism** ['mægnɪtɪzəm] *n* 1. maqnit anlayışı haqqında elm; 2. füsunkarlıq, cazibədarlıq *(adamda)*
**magnetize, -ise** ['mægnɪtaɪz] *v* 1. maqnitləşdirmək; 2. *məc.* cəzb/cəlb etmək
**magneto** [mæg'ni:tou] *n (pl* **-os** [-ouz]) qığılcım yaradan elektrik cihazı
**magnification** [,mægnɪfɪ'keɪʃn] *n* 1. tərifləmə, mədh etmə; 2. böyütmə, şişirtmə, artırma
**magnificence** [mæg'nɪfɪsns] *n* cazibədarlıq; füsunkarlıq, cah-calal, təmtaraq
**magnificent** [mæg'nɪfɪsnt] *adj* əla, çox qəşəng /gözəl, füsunkar, görkəmli, calallı; **a** ~ **house** çox gözəl/qəşəng ev; **a** ~ **achievement** əla nailiyyət; **a** ~ **collection** çox gözəl kolleksiya
**magnificently** [mæg'nɪfəsntlɪ] *adv* əla, çox gözəl /qəşəng, füsunkarcasına; *The whole team played magnificently Bütün komanda əla/çox gözəl oynadı*
**magnify** ['mægnɪfaɪ] *v (pt, pp* **-fied**) şişirtmək, böyütmək; **to** ~ **an incident** hadisəni şişirtmək
**magnifying** ['mægnɪfaɪŋ] *adj* böyüdücü; **a** ~ **glass** lupa, böyüdücü şüşə
**magniloquence** [mæg'nɪləkwəns] *n* təmtəraq, cah-calal, dəbdəbə
**magniloquent** [mæg'nɪləkwənt] *adj* təmtəraqlı; cah-calallı, dəbdəbəli; gəlişigözəl *(söz haq.)*
**magniloquently** [mæg'nɪləkwəntlɪ] *adv* təmtəraqla, dəbdəbə ilə
**magnitude** ['mægnɪtju:d] *n* böyüklük; miqyaslıq; **star of the first** ~ *astr.* ən böyük ulduz
**magnolia** [məg'noulɪə] *n bot.* maqnoliya *(iri, gözəl və ətirli çiçəkləri olan həmişəyaşıl ağac və ya kol)*
**magpie** ['mægpaɪ] *n* 1. sağsağan; 2. *məc.* çox danışmaqla zəhlə tökən adam, çərənçi adam; 3. xırdaçı, xırda şeyləri yığıb saxlayan adam
**Magyar**[1] [mægja:] *n* 1. macar; 2. macar dili
**Magyar**[2] [mægja:] *adj* 1. macar; 2. macar dili; **the** ~ **language** macar dili
**mahogany** [mə'hɔgənɪ] *n* 1. *bot.* qızılağac; ~ **furniture** qızılağacdan qayrılmış mebel; 2. rəng *(qırmızı qəhvəyi)*



**maid** ['meɪd] *n* 1. qız; **old** ~ qarımış qız; 2. qadın xidmətçisi; qarabaş; **house** ~ ev qulluqçusu/qarabaşı; **to keep a** ~ qulluqçu/ qarabaş saxlamaq
**maiden** ['meɪdn] *n* 1. ərə getməmiş qızın soyadı; 2. ilkin, birinci; **a ship's** ~ **voyage** gəminin ilk səfəri; **a** ~ **speech** parlamentdə ilk dəfə edilən nitq
**maidenhead** ['meɪdnhed] *n* qızlıq, bakirəlik
**maidenhood** ['meɪdnhud] *n* qızlıq dövrü
**maiden like** ['meɪdnlaɪk] *adj* arvadxasiyyət, arvad kimi, arvadaoxşar; qızbibi
**mail** [meɪl] *n* I təbəqə; zireh
**mail** [meɪl] *n* II 1. poçt; poçt ilə göndəriş; **to send a letter by air** ~ aviapoçtla məktub göndərmək; **the** ~ **coach** poçt arabası/kareti; ~ **bag** poçt çantası; **to deliver/to collect** ~ poçtu çatdırmaq/toplamaq; 2. korrespondensiya *(poçtla göndərilən məktub, teleqram, qəzet və s.)*
**mail box** ['meɪlbɔks] *n* poçt qutusu
**mail train** ['meɪltreɪn] *n* poçt qatarı
**maim**[1] [meɪm] *n* 1. şikəstlik, əlillik; 2. *hüq.* xəsarət
**maim**[2] [meɪm] *v* şikəst etmək; *He was seriously maimed in the war O, müharibədə ciddi şəkildə şikəst oldu*
**main**[1] [meɪn] *n* magistral, ana/əsas xətt; *My new house is not yet connected to the mains Mənim təzə evim hələ su və başqa boru xətlərinə birləşdirilməyib*
**main**[2] [meɪn] *adj* əsas; baş; vacib; **the** ~ **thing to remember** yadda saxlamalı vacib/əsas məsələ; **the** ~ **street of a town** şəhərin baş küçəsi; **the** ~ **point of my argument** mənim dəlilimin başlıca/əsas cəhəti
**mainly** ['meɪnlɪ] *adv* əsasən, başlıca olaraq; *You are mainly to blame Əsasən günahkar sənsən /sizsiniz; The people who came were mainly women Gələn adamlar əsasən qadınlar idi*
**maintain** [meɪn'teɪn] *v* 1. qoruyub saxlamaq; davam etdirmək; **to** ~ **friendly relations (with)** dost münasibətlərini qoruyub saxlamaq /davam etdirmək *(bir kəslə)*; **to** ~ **prices** qiymətlərin sabitliyini qoruyub saxlamaq; 2. müdafiə etmək; saxlamaq, qoruyub saxlamaq; **to** ~ **a family** ailə saxlamaq; **to** ~ **an army** ordu saxlamaq; 3. sübut etmək; **to** ~ ***one's*** **innocence** günahsızlığını sübut etmək; 4. saz vəziyyətdə saxlamaq; **to** ~ **the roads** yolları saz vəziyyətdə saxlamaq; 5. müdafiə etmək; **to** ~ ***one's*** **rights** hüquqlarını müdafiə etmək
**maintenance** ['meɪntənəns] *n* qoruyub saxlama; mühafizə etmə
**maisonnette** [,meɪzə'net] *n fr.* 1. balaca ev; 2. mənzil
**maize** [meɪz] *n bot.* qarğıdalı
**majestic** [mə'dʒestɪk] *adj* sehrkar; ecazkar; möcüzəli
**majestically** [mæ'dʒestɪklɪ] *adv* sehrlə, ecazkarlıqla; möcüzəli şəkildə

**majesty** ['mædʒəstɪ] *n* 1. böyüklük, əzəmət, vüqar, 2. əlahəzrət; zatı-aliləri; **His/Her/ Your Majesty** Zatı-aliləri *(müraciət edilən şəxsdən asılı olaraq müvafiq əvəzlik işlədilir)*
**major**[1] ['meɪdʒəʳ] *n* 1. *hərb.* mayor; 2. *hüq.* həddi-büluğa çatmış adam; 3. *mus.* major
**major**[2] ['meɪdʒəʳ] *adj* böyük; əsas; daha vacib; **the** ~ **part** əsas hissə; *This is the major problem Bu əsas/vacib problemdir*; **a question of** ~ **importance** böyük əhəmiyyət kəsb edən məsələ; **the** ~ **banks/companies** böyük banklar /şirkətlər; ~ **repair** əsaslı təmir
**major**[3] ['meɪdʒəʳ] *v* ixtisaslaşmaq; *I majored in medieval history Mən orta əsrlər tarixi üzrə ixtisaslaşdım*
**major general** ['meɪdʒə'dʒenərəl] *n* general mayor *(hərbi rütbə)*
**majority** [mə'dʒɔrɪtɪ] *n* 1. əksəriyyət; **a small /overwhelming** ~ kiçik/böyük əksəriyyət; **in the** ~ **of cases** əksər hallarda; *The majority of speakers were men Məruzəçilərin əksəriyyəti kişilər idi; In our school girls are in the majority Bizim məktəbimizdə qızlar əksəriyyət təşkil edir; They had a majority in Parliament Onlar parlamentdə əksəriyyət təşkil edirdilər; He was elected by a narrow majority O, kiçicik üstünlüklə seçildi*; ~ **rule** azlığın çoxluğa tabe olması qaydası; 2. *hüq.* yetkinlik; **to reach** ***one's*** ~ yetkinlik dövrünə çatmaq
**make**[1] [meɪk] *n* 1. istehsal; mal; **goods of Azerbaijan** ~ Azərbaycanın istehsalı olan mallar; 2. marka; *What make is your car Sənin/Sizin maşınının/maşınınızın markası nədir?* **cameras of all** ~**s** bütün markalardan olan aparatlar
**make**[2] [meɪk] *v (pt, pp* **made**) I *əsas fel kimi:* 1. tikmək; yaratmaq; *They have made a reservoir in the mountain Onlar dağda su anbarı tikiblər*; 2. yaranmaq; *They are made for one another Onlar bir-biri üçün yaranıblar*; 3. törətmək; yaratmaq; **to** ~ **difficulties** çətinlik yaratmaq /törətmək; 4. istehsal etmək, qayırmaq, hazırlamaq; **to** ~ **cars/ glass/tractors** maşın/şüşə/traktor istehsal etmək; *This factory makes 500 cars a day Bu zavod gündə 500 maşın istehsal edir; What's this made of Bu nədən qayrılıb?*; **to** ~ **furniture/a film** mebel/kino istehsal etmək; 5. *məc.*: bağışlamaq, doğurmaq; **to** ~ **an impression on** təsir bağışlamaq; 6. hazırlamaq; hazır etmək; düzəltmək; **to** ~ **breakfast/supper** səhər /axşam yeməyi hazırlamaq; **to** ~ **tea/coffee** çay/qəhvə hazırlamaq; **to** ~ **bed** yer açmaq/salmaq; **to** ~ **a bonfire** tonqal qalamaq; **to** ~ **hay** ot biçmək/çalmaq; 7. qeyd etmək; yazmaq; oxumaq; **to** ~ **notes of a lecture** mühazirədən qeydlər etmək; *Make a note of my telephone number Mənim telefonumun nömrəsini yaz/yazın*; **to** ~ **a report** məruzə/hesabat hazırlamaq; **to** ~ **a statement** bəyanat hazırlamaq/vermək; **to** ~ **a**

speech nitq söyləmək/irad etmək; to ~ a list siyahı hazırlamaq/tutmaq; We made an agreement with the publishing house Biz nəşriyyatla müqavilə imzaladıq; When shall we meet? Let's make it Sunday Nə vaxt görüşəcəyik? Gəlin bazar gününə vədələşək; 8. etmək, səbəb olmaq; to ~ a noise səs etmək/salmaq; məcbur etmək; I made him believe that... Mən onu inanmağa məcbur/ vadar etdim ki,...; 9. çıxmaq, həyata keçirmək; to ~ a journey/a trip səyahətə/ gəzintiyə çıxmaq; to ~ a landing yerə enmək; We made it in time for supper Biz şam yeməyinə vaxtında çatdıq; 10. əldə etmək; almaq; qazanmaq; to ~ money pul qazanmaq; How much do you make a month? Sən/Siz ayda nə qədər pul qazanırsan/ qazanırsınız? I am making my living by writing Mən pulumu yazmaqla qazanıram; to ~ friends dostlaşmaq, dost qazanmaq; He has made a lot of friends here O burada özünə xeyli dost qazanıb

**make** [meɪk] v (pt, pp made) II bağlayıcı fel kimi: olmaq; etmək; ibarət olmaq; Two and three makes five İki ilə üç beş edir; 1000 grams make 10 kilograms 1000 qram 10 kq edir; How many players make a football team Bir futbol komandası neçə oyunçudan ibarət olur? He'll make a good doctor Ondan yaxşı həkim olacaq/çıxacaq; to ~ an answer cavab vermək; What do you make the answer Səncə/Sizcə cavab neçə olacaq? What do you make the time? Sizcə indi saat neçədir?; to ~ arrangements about smth. bir şey haqqında razılığa gəlmək; to ~ smb. angry bir kəsi acıqlandırmaq/qəzəbləndirmək; to ~ smb. happy bir kəsi xoşbəxt etmək/ sevindirmək; to ~ for yönəlmək, yollanmaq; yön almaq; He made for the exit O, çıxışa tərəf yönəldi; The dog made straight for the cat İt pişiyin düz üstünə atıldı; to ~ out 1) tanımaq; fərqləndirmək; hesab etmək; seçmək, ayırd etmək; I can't make out his handwriting Mən onun xəttini ayırd edə bilmirəm; He made out a figure in the dark O, qaranlıqda bir adam gördü; He is not such a fool as they made out O onların hesab etdikləri kimi bir o qədər də axmaq deyil; 2) işləri getmək; How is he making out now Onun indi işləri necə gedir?; to ~ over vermək; ötürmək; bağışlamaq; He made over the estate to his son O, mülkünü/malikanəsini oğluna verdi/bağışladı; to ~ up düzəltmək; açmaq; I'll make up a bed for you Mən sənin /sizin üçün yer açacağam; Make up the fire before you go out Getməmişdən əvvəl ocağı qala/qalayın; to ~ up a prescription reseptə uyğun olaraq dərman düzəltmək; I'll make up a parcel of books for you Mən sənə/sizə bir neçə kitab bağlama edib göndərəcəyəm; We'll make up a majority Biz əksəriyyəti təşkil edəcəyik; to ~ up a game özündən oyun fikirləşmək; to ~ up one's mind qərara gəlmək; qərar qəbul etmək; to ~ up one's face üzünü qrimləmək; to ~ up for lost time itirilmiş vaxtın əvəzini çıxmaq

**maker** ['meɪkəʳ] n 1. istehsalçı; usta; sənətkar; yaradıcı; a ~ of history tarixin yaradıcısı; a ~ of maps kartoqraf, xəritəçi/coğrafiya xəritələri çəkən mütəxəssis; 2. Allah, Tanrı; He's gone to meet his maker O, Allahın dərgahına getdi/öldü

**makeshift** ['meɪkʃɪft] n əvəzləyici; We used the sofa as a makeshift for a bed Biz çarpayı əvəzinə divandan istifadə etdik

**make-up** ['meɪkʌp] n 1. kosmetika; She doesn't use make-up O, kosmetikadan istifadə etmir; 2. teatr. qrim

**make weight** ['meɪkweɪt] n pərsəng (çəkini tarazlayan əlavə yük)

**making** ['meɪkɪŋ] n 1. istehsal; hazırlama; the ~ of cars maşınların istehsalı; 2. məc. yonub düzəldən; adam edən; The army was the making of him Ordu onu adam etdi

**mal-** [mæl-] pref. pis; to maltreat pis rəftar etmək

**Malacca** [mə'lækə] n coğ. Sumatra ilə Malay adaları arasında kiçik boğaz

**maladroit** ['mælədrɔɪt] adj yöndəmsiz, bacarıqsız, təklifsiz, ədəbsiz

**malady** ['mælədɪ] n mərəz; xəstəlik, dərd

**malaria** [mə'lɛərɪə] n malyariya

**malarial** [mə'lɛərɪəl] adj malyariyalı; malyariya xəstəliyinə tutulmuş; ~ district malyariya xəstəliyi olan rayon

**Malay** [ma:'leɪ] adj 1. Malaylı; Malay adaları və Arxipelaqda yaşayan dərisi qara adam; 2. Malay dili

**Malayan** [mə'leɪən] adj Malay; the ~ language Malay dili

**Malay Peninsula** [ma:'leɪpɪ'nɪnsjulə] n coğ. Malay yarımadası

**Malaysia** [mə'leɪzɪə] n Malayziya

**malcontent** ['mælkəntent] adj narazı; razı qalmayan

**male** [meɪl] adj 1. erkək; kişi; the ~ sex kişi cinsi; ~ cat/dog erkək pişik/it; 2.: tex. ~ screw vint

**malediction** [ˌmælɪ'dɪkʃn] n qarğış, lənət, qarğış/lənət yağdırma

**malefactor** ['mælɪfæktəʳ] n qanunu pozan, cinayətkar, cani; yaramaz

**maleficent** [mə'lefɪsnt] adj çox ziyanlı/zərərli, fəlakətli

**malevolent** [mə'levələnt] adj ziyankar, bədxah; ~ people bədxah/ziyankar adamlar; to be ~ to smb. bir kəsə bədxahlıq etmək/ziyan vurmaq

**malevolently** [mə'levələntlɪ] adv ziyankarcasına, bədxahlıqla; acıqla, hirslə; kinli-kinli

**malevolence** [mə'levələns] n bədxahlıq, ziyankarlıq

**malformation** [ˌmælfɔ:'meɪʃn] n anadangəlmə qüsurluluq, əyrilik; eybəcərlik; ~ of the spine belin anadangəlmə əyriliyi



**malformed** ['mælfɔ:md] adj pis formalaşmış; əyri bitmiş; eybəcər

**malfunction** ['mælfʌŋkʃn] v normal şəkildə formalaşa bilməmək/təşəkkül tapmamaq

**malice** ['mælɪs] n kin, acıq, ədavət, qərəz, hirs; riyakarlıq, məkr, hiylə; to bear smb. no ~ bir kəsə qarşı heç bir kin bəsləməmək; with ~ aforethought qəsdən edilən çirkin niyyətlə

**malicious** [mə'lɪʃəs] adj pis, yaman, qərəzli, riyalı; məkrli; hiyləli; ~ gossip məkrli dedi-qodu

**maliciously** [mə'lɪʃəslɪ] adv riyakarlıqla, məkrlə, hiylə ilə, acıqla, hirslə

**malign¹** [mə'laɪn] adj ürəyətoxunan, ürəkqıran, ürəkbulandıran; xəbis

**malign²** [mə'laɪn] v ləkələmək; böhtan atmaq, iftira etmək; dalca danışmaq; to ~ an innocent person günahsız adama böhtan atmaq

**malignancy** [mə'lɪgnənsɪ] n bədxahlıq; bədniyyətlik, xəbislik

**malignant** [mə'lɪgnənt] adj bədniyyət, bədxah; xeyirsöyləməz; gözügötürməz

**malignity** [mə'lɪgnətɪ] n 1. bədniyyətlik, bədxahlıq; yamanlıq; 2. tib.: of ~ character bədxassəlik

**malinger¹** ['mælɪndʒəʳ] n simulyant (özünü xəstəliyə vuraraq işdən yayınmağa çalışan adam)

**malinger²** ['mælɪndʒəʳ] v özünü xəstəliyə qoymaq/vurmaq, özünü xəstə kimi göstərmək; He's just malingering O sadəcə olaraq özünü xəstəliyə vurur

**mallard** ['mæla:d] n vəhşi ördək

**malleability** ['mælɪəˌbɪlɪtɪ] n 1. döyülüb əzilə bilən; 2. tərbiyə/islah edilmə; yoluna qoyulma

**malleable** ['mælɪəbl] adj 1. çəkiclə döyülüb əzilə bilən (dəmir); 2. məc. yöndəmə salına bilən; tərbiyə edilə bilən

**mallet** ['mælɪt] n 1. ağac çəkic; 2. kriket oyununda topu vurmaq üçün istifadə edilən taxtadan hazırlanmış çəkicəbənzər alət

**malnutrition** [ˌmælnju:'trɪʃn] n pis qidalanma

**malodorous** [ˌmæl'oudərəs] adj pis iyli/ qoxulu; üfunətli

**malpractice** [ˌmæl'præktɪs] n hüq. işi yarıtmaz yerinə yetirmə; laqeydlik; səhlənkarlıq (işdə); sui-istifadə

**malt¹** [mɔ:lt] n səməni; acıtma; maya halına salma

**malt²** [mɔ:lt] v acıtmaq, acımaq, maya halına salmaq/düşmək, qıcqırmaq, qıcqırtmaq; səməni qoymaq (arpa və ya başqa taxıldan)

**Maltese¹** ['mɔ:lti:z] n 1. Maltalı; Malta sakini; 2. Malta dili

**Maltese²** ['mɔ:lti:z] adj Malta; ~ cat/dog Malta pişiyi/iti

**maltreat** [ˌmæl'tri:t] v kobud/qaba rəftar etmək

**maltreatment** [ˌmæl'tri:tmnt] n pis/kobud/qaba rəftar

**maltster** ['mɔ:ltstəʳ] n balatı/maya hazırlayan adam

**malversation** [ˌmælvə'seɪʃn] n idarəçilikdə sui-istifadə

**mamba** ['mæmbə] n mamba (qara və ya yaşıl rəngli zəhərli Afrika ilanı)

**mam(m)a** [mə'ma:]; [ma:mə] n anacan

**mammal** ['mæml] n zool. məməlilər, məməli heyvanlar

**mammon** ['mæmən] n var, dövlət, var-dövlət, sərvət, zənginlik; tamahkarlıqla/acgözlüklə yığılan var-dövlət

**mammoth¹** ['mæməθ] n mamont (qazıntı halında tapılan filcinsli heyvan)

**mammoth²** ['mæməθ] adj mamontabənzər; nəhəng, yekəpər

**mammy** ['mæmɪ] n 1. uşağın anasına müraciətlə dediyi söz; 2. ağ uşaqlara baxan zənci dayə

**man¹** [mæn] n 1. insan, adam; kişi; the rights of a ~ insanın hüquqları; the ~ in the street adi insan; her young ~ onun gənc pərəstişkarı; Be a man! Kişi/Adam ol!; a ~ of law vəkil, hüquqşünas; a ~ of letters yazıçı, ədib; men and management fəhlələr və müdiriyyət; officers and men zabitlər və əsgərlər; 2. adam, yoldaş, həmkar; If you need a carpenter, I'm your man Əgər sənə/ sizə dülgər lazımdırsa, məni gör/görün; I'm not a drinking man Mən içən adam deyiləm; every ~ for himself hər kəs özü üçün; Good man! Əhsən!; to a ~ hamı bir nəfər kimi; I've known him man and boy Mən onu uşaqlıqdan tanıyıram; I talked to him as a man to a man Mən onunla kişi kimi söhbət elədim /danışdım.Mən onunla kişi söhbəti etdim /elədim

**man²** [mæn] v 1. hərb. dən. heyət təşkil etmək; to ~ a vessel gəmi üçün heyət təşkil etmək; 2. idarə etmək; We haven't enough staff to man the lifts Liftləri idarə etmək üçün kifayət qədər işçilərimiz yoxdur

**manacle** ['mænəkl] n 1. qandal; dəmir zəncir; 2. maneə, maneçilik

**manage** ['mænɪdʒ] v 1. nəzarət etmək; baxmaq; idarə etmək; to ~ a horse atı idarə etmək; to ~ a business işə rəhbərlik etmək; to ~ a naughty child dəcəl uşağın öhdəsindən gəlmək; 2. əlindən gəlmək, yolunu tapmaq; I shan't be able to manage without help Mən köməksiz işin öhdəsindən gələ bilmərəm; She managed to keep her temper O özünü ələ ala bildi; 3. müyəssər/ müvəffəq olmaq; I managed to see him Mən onu görməyə müyəssər oldum

**manageable** ['mænɪdʒəbl] adj idarə edilən, öhdəsindən gəlməsi mümkün olan; a ~ child idarə olunan uşaq

**management** ['mænɪdʒmənt] n 1. idarəçilik; nəzarət; The failure was caused by bad management Uğursuzluğa səbəb pis nəzarət/ idarəçilik oldu; 2. bacarıq; qabiliyyət; biclik, hiylə; It needed a good deal of management to persuade

*them Onları inandırmaq üçün mən xeyli biclik işlətdim*; 3. sənayeyə/müəssisəyə rəhbərlik; **joint consultation between workers and ~** fəhlə və rəhbərlik arasında birgə məsləhətləşmələr
**manager** [ˈmænɪdʒəʳ] *n* 1. işə/idarəyə nəzarət edən şəxs; 2. rəhbər, menicer, müdir
**managerial** [ˌmænɪˈdʒɪərɪəl] *adj* menicerə xas /aid olan
**Manchester** [ˈmæntʃestəʳ] *n* İngiltərədə şəhər
**Manchu** [ˌmænˈtʃu:] *n* 1. Mançuriyalı *(adam)*; 2. Mançuriya dili
**Manchuria** [ˌmænˈtʃu:rɪə] *n coğ.* Şimali Çində ərazi
**mandarin** [ˈmændərɪn] *n* 1. Çində dövlət məmuru; 2. Çin dilinin geniş yayılmış bir qolu; 3. *bot.* mandarin
**mandate**[1] [ˈmændeɪt] *n* mandat; tapşırıq
**mandate**[2] [ˈmændeɪt] *v* səlahiyyətini həyata keçirmək *(bir ərazi üzrə)*
**mandatory** [ˈmændətrɪ] *adj* səlahiyyətli; mandatlı, mandatı olan; **the ~ power** səlahiyyətli hakimiyyət
**mandible** [ˈmændɪbl] *n* 1. məməlilərdə və balıqlarda alt çənə; 2. quşun dimdiyinin hər iki tərəfi
**mandolin** [ˈmændəlɪn] *n* mandolina *(musiqi aləti)*; **to play the ~** mandolina çalmaq
**mandragora** [mænˈdrægərə] *n bot.* mandraqora *(badımcan fəsiləsindən zəhərli bitki)*
**mandrake** [ˈmændreɪk] *n* = **mandragora**
**mandril** [ˈmændrɪl] *n* mandril *(qərbi Afrikada iribaşlı qısaquyruqlu meymun)*
**mane** [meɪn] *n* yal *(atda)*
**man-eater** [ˈmænˌi:təʳ] *n* 1. adamyeyən, yamyam; 2. adamyeyən *(şir, pələng və s.)*
**maneuver**[1] [məˈnu:vəʳ] *n amer.* = **manoeuvre**[1]
**maneuver**[2] [məˈnu:vəʳ] *v amer.* = **manoeuvre**[2]
**manful** [ˈmænfl] *adj* qoçaq, qətiyyətli
**manfully** [ˈmænfəlɪ] *adv* kişi kimi, mərd-mərdanə
**manfulness** [ˈmænfulnɪs] *n* kişilik; qoçaqlıq
**manganese** [ˈmæŋgəni:z] *n* manqan *(polad, şüşə və s. istehsalında istifadə edilən açıq-boz rəngli metal)*
**mange** [meɪndʒ] *n* yoluxucu dəri xəstəliyi; qoturluq *(itlərdə və pişiklərdə)*
**mangel-wurzel** [ˈmændʒlˈwə:zl] *n* yem çuğunduru, pazı *(mal yemi üçün istifadə edilən)*
**manger** [ˈmeɪndʒəʳ] *n* axur
**mangle**[1] [mæŋgl] *n* paltarı hamarlamaq üçün girdə ağac parçası
**mangle**[2] [mæŋgl] *v* 1. kəsmək, kəsilmək; parçalamaq; əzmək, əzilmək; *He was knocked down by a lorry and badly mangled Onu yük maşını vurub əzdi/şil-küt etdi*; 2. *məc.* xarab/bərbad etmək; şikəst etmək; 3. təhrif etmək; **to ~ a piece of music** musiqi parçasını təhrif etmək; **to ~ a name** adı təhrif etmək
**mango** [ˈmæŋgou] *n bot.* *(pl* **-oes** *və ya* **-os** [ouz] 1. manqo meyvəsi; 2. manqo ağacı
**mangy** [ˈmeɪndʒɪ] *adj* qotur; qotur tutmuş/düşmüş; **a ~ dog/goat** qotur it/keçi
**manhandle** [ˈmænˌhændl] *v* 1. yapışmaq; qamarlamaq; 2. kobud davranmaq, döymək; qol gücü ilə danışmaq
**Manhattan** [mænˈhætn] *n* I Manhattan *(şəhər)*
**manhattan** [mænˈhætn] *n* II manhattan *(viski və vermud şərabı ilə hazırlanmış kokteyl)*
**manhole** [ˈmænhoul] *n* baca; lyuk *(yer altında boru və s. yoxlamaq, təmir etmək üçün üstüqapaqlı deşik)*
**manhood** [ˈmænhud] *n* 1. kişilik dövrünə çatmış adam; 2. kişilik; 3. kişi əhalisi *(şəhərin, ölkənin, kəndin və s.)*
**manhour** [ˈmænauəʳ] *n* bir saat ərzində görülən iş *(adambaşına)*
**mania** [ˈmeɪnɪə] *n* 1. maniya; dəlilik; 2. bir şeyə qarşı hədsiz istək; *She has a mania for driving Onun maşın sürməyə hədsiz həvəsi var, O, maşın sürmək dəlisidir*
**maniac** [ˈmeɪnɪək] *n* 1. çılğın, manyak, dəli; 2. hədsiz dərəcədə həris adam
**maniacal** [məˈnaɪəkl] *adj* manyak, dəli; dəlicəsinə; **a ~ attack** dəlicəsinə hücum; **~ behaviour/laughter** dəlicəsinə davranış/ gülüş
**manicure**[1] [ˈmænɪkjuəʳ] *n* manikür; *She has a manicure once a week O, həftədə bir dəfə manikürə gedir*
**manicure**[2] [ˈmænɪkjuəʳ] *v* manikür etmək
**manicurist** [ˈmænɪkjuərɪst] *n* manikürçü, manikür edən
**manifest**[1] [ˈmænɪfest] *n* deklarasiya; bəyannamə *(gəmidə yükün, təyyarədə sərnişinlərin, qatarda aparılan malların adlarını bildirən siyahı)*
**manifest**[2] [ˈmænɪfest] *adj* açıq-aşkar; hamının qəbul etdiyi; **a ~ truth** hamının qəbul etdiyi həqiqət
**manifest**[3] [ˈmænɪfest] *v* 1. açıb göstərmək; 2. işarə vermək; əlamətlərini göstərmək, meyl etmək; *She doesn't manifest much desire to marry him O onunla evlənməyə o qədər də meyl göstərmir*; 3. meydana çıxmaq; özünü büruzə vermək; *No disease manifested itself during the long voyage Uzunmüddətli səfər zamanı heç bir xəstəlik özünü büruzə vermədi*
**manifestation** [ˌmænɪfesˈteɪʃn] *n* bəyan olma; aşkara çıxma; manifestasiya
**manifesto** [ˌmænɪˈfestou] *n* *(pl* **-os, -oes** [-ouz]) manifest; bəyannamə, elan etmə
**manifold**[1] [ˈmænɪfould] *n* 1. *tex.* kollektor; boru xətti; 2. cürbəcürlük, rəngarənglik, müxtəliflik; 3. surətçıxaran aparat, kopiya kağızı
**manifold**[2] [ˈmænɪfould] *adj* 1. çox hissələri olan; 2. çox növlü, çox çeşidli
**manikin** [ˈmænəkɪn] *n* 1. maneken *(balaca adam)*; 2. insan bədəninin nümunəsi *(tibb məktəblərində, incəsənət məktəblərində saxlanılan)*
**Manila** [məˈnɪlə] *n* Manila *(şəhər; Filippinin paytaxtı)*



**manila hemp** [məˈnɪləhemp] *n* Filippin ağaclarının qabığı *(kəndir hazırlamaq üçün)*
**Manila paper** [məˈnɪləpeɪpəʳ] *n* Manila kağızı *(qalın, bərk kağız)*
**manipulate** [məˈnɪpjuleɪt] *v* 1. əl ilə idarə etmək/iş görmək; məharətlə işlətmək, ələ davranmaq; 2. sui-istifadə etmək; istismar etmək; 3. faktları öz xeyrinə təhrif etmək /dəyişmək; **to ~ facts** faktları qəsdən təhrif etmək; 4. qazanc əldə etmə; **to make a lot of money by clever ~ of the Stock Market** ağıllı bank əməliyyatı aparmaqla külli miqdarda qazanc əldə etmək
**manipulation** [məˌnɪpjuˈleɪʃn] *n* 1. əl işi; əl ilə idarə etmə; 2. əl qatma; hiylə işlətmə; 3. *tex.* əməliyyatı idarə etmə
**mankind** [ˌmænˈkaɪnd] *n* 1. bəşəriyyət; insanlıq; 2. [ˈmænkaɪnd] kişi əhalisi
**manlike** [ˈmænlaɪk] *adj* kişiyə xas olan, kişi kimi, kişixasiyyət *(qadın haq.)*
**manliness** [ˈmænlɪnɪs] *n* 1. kişiyanalıq; 2. igidlik, qoçaqlıq, kişilik
**manly** [ˈmænlɪ] *adj* kişiyana, kişi kimi
**manna** [ˈmænə] *n* 1. manna *(İzrail əhalisinin 40 il səhrada olduğu zaman allahın onlara göndərdiyi ərzaq/qida)*; 2. *məc.* hər hansı ruhi qida verən şey
**mannequin** [ˈmænɪkɪn] *n* 1. maneken, müqəvva; 2. *arx.* maneken *(yeni fason paltarları nümayiş edən atelye işçisi)*;
**manner** [ˈmænəʳ] *n* 1. tərz, üsul; üslub; yol; metod; *Do it in this manner Bunu bu yolla et*; **~ of life** həyat tərzi; **in this ~** bu yolla; **by no ~ of means** heç vəchlə; *I don't like his manner of speaking Mən onun danışıq tərzini xoşlamıram; He writes in the manner of Sabir O, Sabir üslubunda yazır*; 2. növ, sort; **all ~ of men** hər növ/sort adamlar; **all ~ of tools** hər növ/cür alətlər; *What manner of man is he? O nə cür /necə adamdır?* 3. davranış *(adət. cəm halda işlənir); He has got good manners O, ədəbli davranır; Mind your manners Özünü/Özünüzü yaxşı apar/aparın*
**mannerism** [ˈmænərɪzm] *n* 1. xasiyyət, adət; *Don't take notice of his winking, it's a mannerism of his Onun göz qırpmasına fikir vermə, bu onun adətidir*; 2. sünilik
**mannerly**[1] [ˈmænəlɪ] *adj* 1. xoş davranışlı; mülayim; 2. ədəbli; tərbiyəli
**mannerly**[2] [ˈmænəlɪ] *adv* ədəblə, tərbiyəli; *He spoke mannerly to me O mənimlə ədəblə danışdı*
**mannish** [ˈmænɪʃ] *adj* 1. kişisayağı, kişiyəbənzər *(qadınlar haq.)*; 2. kişiyə xas olan
**manoeuvre**[1] [məˈnu:vəʳ] *n* 1. manevr *(orduda)*; *The troops are on manoeuvres Qoşunlar manevr edir*; 2. aldadıcı planlı hərəkət *(manevr)*; *He got his way by devious manoeuvres O müxtəlif kələkbazlıqla öz məqsədinə çatdı*
**manoeuvre**[2] [məˈnu:vəʳ] *v* 1. manevr etmək; *The fleet is manoeuvring off the east coast Dəniz qoşunları şərq sahillərində manevr edir; The yachts were manoeuvring for position Yaxtalar yaxşı mövqeyə çıxmaq üçün manevr edirdilər*; 2. *məc.*: **to ~ smb. into a good job** bir kəsi məharətlə yaxşı bir işə düzəltmək
**manoeuvrable** [məˈnu:vrəbl] *adj* manevr edilə /edə bilən
**manoeuvrability** [məˌnu:vrəˈbɪlɪtɪ] *n* manevr etmə qabiliyyəti
**manor** [ˈmænəʳ] *n* mülk, bəylik/ağalıq yeri, malikanə *(feodalizm cəmiyyətində)*
**manpower** [ˈmænpauəʳ] *n* 1. canlı qüvvə; fəhlə qüvvəsi; 2. şəxsi heyət, insan ehtiyatı
**mansard** [ˈmænsa:d] *n mem.* mansarda *(çatı altında çəp tavanlı otaq)*
**manse** [mæns] *n* kilsə xadiminin evi *(Şotlandiyada)*
**mansion** [ˈmænʃn] *n* 1. iri/möhtəşəm ev; **The ~ House** Londonun Lord merinin rəsmi iqamətgahı; 2. çoxmərtəbəli/ çoxqatlı ev
**manslaughter** [ˈmænslɔ:təʳ] *n* 1. insan qırğını; insan tələfatı; 2. *hüq.* təsadüfi ölüm/qətl; *A driver who hits and kills someone accidentally may be charged with manslaughter Bir kəsi maşınla basıb öldürmüş sürücü təsadüfi ölüm maddəsilə mühakimə edilə bilər*
**mantel** [ˈmæntl] *n* buxarı
**mantelpiece** [ˈmæntlpi:s] *n* buxarı bacası *(mərmər, kərpic, daş və sairlə hörülmüş)*
**mantes** [ˈmæntɪs] *n* **mantis** *isminin cəm forması*
**mantis** [ˈmæntɪs] *n zool.* dəvədəlləyi *(həşərat)*
**mantle**[1] [ˈmæntl] *n* 1. çiyinlik, bürüncək; 2. mantiya *(qolsuz uzun üst geyimi)*
**mantle**[2] [ˈmæntl] *v* 1. örpəklə örtmək, örpək salmaq; bürümək; **to ~ smb. in a cloak** bir kəsi plaşla bürümək; *Dark clouds mantled the sky Qara buludlar göyü/səmanı bürüdü*; 2. köpüklə /ərplə örtülmək; köpükləmək *(şərab haq.)*; 3. qızarmaq *(üz haq.)*, üzə vurmaq *(qan haq.)*; *Her face mantled with blushes Onun sifəti qızardı*
**manual**[1] [ˈmænjuəl] *n* dərslik; təlimat, təlimnamə; **a shorthand ~** stenoqrafiya dərsliyi
**manual**[2] [ˈmænjuəl] *adj* əl ilə görülən/edilən; **~ labour** əl əməyi
**manufacture**[1] [ˌmænjuˈfæktʃəʳ] *n* 1. manufaktura; 2. istehsal, emal etmə, hazırlama; **cloth ~** mahud istehsalı; **of home/ foreign ~** daxili/xarici istehsal; 3. *məc.* uydurma, düzəltmə, qayırma
**manufacture**[2] [ˌmænjuˈfæktʃəʳ] *v* 1. kütləvi şəkildə istehsal etmək *(maşınla)*; **to ~ goods** kütləvi şəkildə mal istehsal etmək *(maşınla)*; 2. icad etmək, bəhanə uydurmaq, uydurmaq *(nağıl və s.)*; **to ~ a false evidence** saxta sübut uydurmaq; **to ~ an excuse** üzr istəmək üçün bəhanə uydurmaq
**manufactured** [ˌmænjuˈfæktʃəd] *adj* 1. istehsal edilmiş; 2. uydurulmuş
**manufacturer** [ˌmænjuˈfæktʃərəʳ] *n* 1. istehsalçı; 2. fabrik sahibi *(şəxs, firma, şirkət və s.)*

**manumit** [ˌmænju'mɪt] *v* azad etmək, azadlığa /sərbəst buraxmaq *(qulu)*
**manumission** [ˌmænju'mɪʃn] *n* azadlığa buraxma *(qulu)*
**manure¹** [mə'njuəʳ] *n* peyin; üzvi gübrə
**manure²** [mə'njuəʳ] *v* gübrələmək; peyin vermək
**manuscript** ['mænjuskrɪpt] *n* əlyazması; əlyazısı; **in a ~** əl yazmasında, əlyazması şəklində
**many¹** ['menɪ] *n* çoxluq, çoxları; çoxu; *A great many of the tourists were tired Turistlərin çoxu yorğun idi; You may take as many as you need Sən/Siz istədiyin/istədiyiniz qədər götürə bilərsən/bilərsiniz; Many think so Çoxları belə fikirləşir; I have as many as you Sizdə nə qədər varsa, bizdə də o qədər var; The boy has twice as many books as the girl has Oğlanın qızınkına nisbətən iki dəfə çox kitabı var;* **as ~ as you like** istədiyin qədər; *He gave back as many as he took O nə qədər götürmüşdüsə o qədər də geri qaytardı*
**many²** ['menɪ] *adj* **(more, most)** çox; **~ people** çox adam; *Many people think so Çox adamlar belə düşünür/fikirləşir; How many? Nə qədər?; How many people are here? Burada nə qədər adam var? I have never seen so many birds Mən hələ ömrümdə bu qədər çox quş görməmişəm; He helped me in many ways O çox cəhətdən mənə kömək etdi; He is like his father in many ways O bir çox cəhətlərinə görə atasına bənzəyir; Many years have passed Çox illər keçib;* **~ years ago** çox-çox qabaq, çox-çox illər qabaq/əvvəl; **~ times** dəfələrlə, çox dəfə
**many-coloured** [ˌmenɪ'kʌləd] *adj* çoxrəngli
**many-sided** ['menɪsaɪdɪd] *adj* çoxtərəfli
**map¹** [mæp] *n* xəritə; **on the ~** xəritədə; **a ~ of the world** dünyanın xəritəsi; **to read a ~** xəritəni oxumaq
**map²** [mæp] *v* xəritə çəkmək; **to ~ out** plan tərtib etmək, planlaşdırmaq; **to ~ out a course of action** fəaliyyət planı tərtib etmək
**maple¹** ['mæpl] *n* **1.** *bot.* ağcaqayın; **2.** Kanadanın emblemi; **3.** ağcaqayın oduncağı *(taxtası)*
**maple²** ['mæpl] *adj* ağcaqayın; **~ sugar** ağcaqayın şəkəri
**maquis** [ma:kɪ] *n fr* maki *(II Dünya Müharibəsində fransız partizanlar)*
**mar** [ma:] *v* **(-rr-) 1.** korlamaq, pozmaq; *Nothing marred the happiness of our evening party Axşam qonaqlığımızı/şənliyimizi heç bir şey korlamadı;* **2.** *məc.* vurub yıxmaq, dağıtmaq; *Make or mar ≅ Ölmək ölməkdir, xırıldamaq nə deməkdir*
**marathon** ['mærəθən] *n* marafon *(uzun məsafəyə qaçış yarışı)*
**maraud** [mə'rɔ:d] *v* çapovulçuluq/ soyğunçuluq etmək, qarətlə məşğul olmaq
**marauder** [mə'rɔ:dəʳ] *n* çoyğunçu, talançı, çapqınçı
**marble¹** ['ma:bl] *n* **1.** mərmər; **2.** *pl* mərmərdən hazırlanmış memarlıq əsəri; **like a ~** mərmər kimi
**marble²** ['ma:bl] *adj* **1.** mərmər; **~ arch** mərmər tağ/sütun; **~ tomb** mərmər məqbərə; **2.** *məc.* mərmər, mərmər kimi; **~ breast** mərmər/ mərmər kimi sinə
**marbled** ['ma:bld] *adj* mərmər, mərmər döşənmiş, mərmərdən olan; **a ~ floor** mərmər döşəmə
**March** [ma:tʃ] *n* mart *(ilin 3-cü ayı)*
**march¹** [ma:tʃ] *n* **1.** addımlama; marş; **on the ~** addımla yeriş zamanı; **2.** marş, musiqi marşı; **military ~es** hərbi marşlar; **a dead ~** matəm marşı
**march²** [ma:tʃ] *v* **1.** addımlamaq *(əsgər kimi); They have marched 30 miles today Onlar bu gün 30 mil məsafə gediblər (piyada); They marched into the town Onlar şəhərə daxil oldular; Forward/Quick march! Addımla marş! (hərbi komanda); He marched up and down the station platform O, stansiyadakı platformada o tərəf bu tərəfə addımladı/var-gəl etdi;* **2.** dartıb aparmaq; *They marched the prisoner away Onlar məhbusu dartıb sürüyə-sürüyə apardılar*
**marchioness** [ˌma:ʃə'nɪs] *n* **1.** markiza *(markizin dul qalmış arvadı)*; **2.** markiz arvadı; **3.** markizanın hüquqlarına bərabər hüquqları olan qadın
**mare** [meəʳ] *n* **1.** madyan; **pedigree ~** cins madyan; **2.** dişi/qancıq eşşək
**margarine** [ˌma:dʒə'ri:n] *n* marqarin *(yağ)*
**marge** [ma:dʒ] *n d.d.* = **margarine**
**margin** ['ma:dʒɪn] *n* **1.** kənar, qıraq *(kitabda, əl yazısında)*; **the ~ of the page** səhifənin kənarı; **2.** kənar, qıraq; **to sit on the ~ of the lake** gölün kənarında/qırağında oturmaq; **road ~s** yolun qıraqları; **3.** çətinlik; *He escaped a defeat by a narrow margin O, canını məğlubiyyətdən çətinliklə qurtardı;* **4.** *tic.* dəyər qiyməti ilə satış qiyməti arasında olan fərq; **~ profit** xalis gəlir
**marginal** ['ma:dʒɪnəl] *adj* **1.** kənarı yazılmamış; ağ buraxılmış; **~ notes** səhifənin kənarında yazılan qeydlər, səhifənin kənarında qoyulmuş, dərkənar; **2.** son həddə çatmış; olduqca böyük; *The differences between these two parties are marginal Bu iki partiya arasındakı fərq olduqca böyükdür;* **3.** istifadə edilməyən, lazımsız; yararsız; **~ land** yararsız torpaq sahəsi, istifadəyə yaramayan torpaq; **4.** səlahiyyəti olmayan, tam səlahiyyəti olmayan; **~ seat/constituency** az səs toplayaraq seçilən parlament üzvü
**marguerite** [ˌma:gə'ri:t] *n* **1.** *bot.* qızçiçəyi; **2.** qızçiçəyi fəsiləsindən olan bitki *(ortası sarı, qıraqları ağ rəngdə olan öküz gözünə bənzər çiçək)*
**marigold** ['mærɪgould] *n bot.* gülünbahar *(sarı rəngli çiçəkləri olan bitki)*
**marijuana, marihuana** [ˌmærɪ'wa:nə] *n bot.* həşiş, tiryək
**marina** [mə'ri:nə] *n* gəzinti qayığı
**marinade¹** [ˌmærɪ'neɪd] *n* marinad, şoraba
**marinade²** [ˌmærɪ'neɪd] *v* marinad etmək, şoraba /turşuya qoymaq



**marine¹** [mə'ri:n] *n* ticarət gəmisi/donanması; **merchant/mercantile ~** ticarət donanması; **the Marines** *top.i* dəniz piyadası;
◊ *Tell that to the Marines Get bunu nənənə danış*
**marine²** [mə'ri:n] *adj* dəniz, dənizə aid olan; **~ products** dəniz məhsulları; **a ~ painter** dəniz lövhələri çəkən rəssam; **~ insurance** dəniz sığortası
**mariner** ['mærɪnəʳ] *n* dənizçi; kompasın istiqamətini müəyyən edən *(matros köməkçisi)*
**marionette** [ˌmærɪə'net] *n* **1.** marionet *(kukla teatrında)*; **2.** mexanizm ilə hərəkət edən kukla; **3.** *məc.* oyuncaq, əlaltı *(başqasının sözü ilə oturub-duran adam)*
**marital** ['mærɪtl] *adj* nikaha aid olan; kəbin; **~ obligations** ailə/nikah öhdəlikləri; **~ status** ailə vəziyyəti
**maritime** ['mærɪtaɪm] *adj* **1.** dənizlə/ naviqasiya ilə bağlı olan; **~ law** dənizçilik qanunu; **the great ~ powers** böyük dəniz dövlətləri; **2.** dənizkənarı, dəniz kənarında yerləşən; **the ~ provinces of Azerbaijan** Azərbaycanın dənizkənarı /dəniz kənarında yerləşən əyalətləri
**Marjoram** ['ma:dʒərəm] *n bot.* mərzə *(qırmızı və ağ çiçəkləri olan ətirli bitki)*
**Mark** [ma:k] *n* İsa peyğəmbərin xələfi/ davamçısı
**mark¹** [ma:k] *n* I **1.** qiymət; ölçü; ləkə; işarə; etiket, nişan, nişanə; **question ~** sual işarəsi; **quotation ~s** dırnaq işarələri; **as a ~ of my respect for you** sənə/sizə mənim hörmət əlamətim olaraq; **laundry ~** camaşırxana etiketi; **high water ~** suyun yüksək səviyyəsini bildirən işarə; *You've got a mark on your jacket Sənin/Sizin jaketinə/jaketinizə ləkə düşüb; Stained fingers are the mark of a smoker Saralmış barmaqlar papiros çəkməyin nişanəsidir;* **trade ~** ticarət nişanı; **2.** *məc.* iz, yol, cığır; *He left his mark on history O, tarixdə öz izini qoydu; He quickly made his mark in his profession O tezliklə öz sənətində özünə iz/yol /cığır açdı;* **3.** məqsəd; niyyət; hədəf; **to hit the ~** hədəfi vurmaq, hədəfə düşmək; **off the ~** hədəfdən yan/kənar; *He is not so far off the mark O, hədəfdən bir o qədər də uzaq düşməyib;* **4.** *id.* xətt, iz, nişan; *On your marks! Qaçış xəttinin üstündə durun!;* **to overstep the ~** start xətti basmaq, xətti keçmək/basdalamaq; **5.** tələb; ölçü; səviyyə; *His work is not up to the mark Onun işi tələbi ödəmir; I'm not feeling up to the mark Mən ·özümü yaxşı hiss etmirəm;* **6.** qiymət; bal; **to get high ~s** yüksək qiymətlər almaq; **to get low ~s/a pass** aşağı qiymət/üç və ya keçici qiymət almaq; **7.** *məc.* tərif, qiymət; **to give** *smb.* **top ~s for courage** bir kəsi şücaətinə/ cəsarətinə görə yüksək qiymətləndirmək/ tərifləmək
**mark** [ma:k] *n* II **1.** alman markası *(Almaniyada pul vahidi)*; **2.** poçt markası
**mark²** [ma:k] *v* **1.** nişanlamaq; qiymətləndirmək; **2.** iz qoymaq, ölçmək; **3.** qeyd etmək; **to ~ *one's* name on *one's* clothes, to ~ *one's* clothes with *one's* name** paltarında öz adını qeyd etmək; *All our stock has been marked down for the sales Bütün mallarımızın satış qiymətləri aşağı salınıb; A zebra is marked with strikes Zebra zolaq-zolaqdır; The decade was marked by industrial expansion Dekada sənayenin genişlənməsi ilə əlamətdardır;* **4.** *hərb.* uçarkən işıqlı iz buraxmaq *(güllə, top gülləsi)*; **5.** göstərmək; işarə etmək; *The way is marked by sign posts Yol işarə dirəkləri ilə nişanlanır/göstərilir; The girl marked the boy's arrival by a nod Qız oğlanın gəlişini başının işarəsi ilə bildirdi;* **6.** yadda saxlamaq; *Mark my words Mənim sözlərimi yadda saxla/saxlayın;* **7.** qiymətləndirmək *(imtahanda); The papers haven't been marked yet İmtahan işləri hələ yoxlanılıb qiymətləndirilməyib;* **to ~ down 1)** yazmaq; qeyd etmək; **2)** *tic.* qiymətini aşağı salmaq; **to ~ up/down the goods** malın qiymətini qaldırmaq/aşağı salmaq; **to ~ off** ayırmaq; *An area has been marked off for a school Məktəb üçün ərazi ayrılıb;* **to ~ out** nişan qoymaq, nişanlamaq; manşırlamaq; müəyyən etmək; **to ~ out a course** kursu müəyyənləşdirmək; kurs götürmək
**marked** ['ma:kt] *adj* qeyd edilmiş/olunmuş, nişanlanmış; *I read the marked pages Mən nişanlanmış səhifələri oxudum;* **a ~ improvement** gözəçarpan inkişaf/irəliləyiş
**market¹** ['ma:kɪt] *n* **1.** bazar; **to go to the ~** bazara getmək; *She went to the market to buy food O, ərzaq almaq üçün bazara getdi;* **the black ~** qara bazar; **to flood the ~ with goods** bazarı malla doldurmaq; *This is the cheapest material on the market Bu, bazarda olan ən ucuz parçadır;* **2.** satış; *This house is on the market Bu ev satılır; There is no market for food like that Belə ərzaq malları yaxşı satılmır;* **The Common Market** Ümumi bazar
**market²** ['ma:kɪt] *adj* bazar; **~ price** bazar qiyməti; **~ condition** bazar şəraiti; **~ economy** bazar iqtisadiyyatı
**market³** ['ma:kɪt] *v* satmaq; *We are marketing our goods in Georgia Biz öz mallarımızı Gürcüstanda satırıq*
**marketable** ['ma:kɪtəbl] *adj* tezsatılan, işə gedən /keçən; **~ goods** tezsatılan mal
**marketing** ['ma:kɪtɪŋ] *n* marketinq; alğı-satqı haqqında nəzəriyyə
**marksman** ['ma:ksmən] *n* sərrast nişan atan, sərrast atəş açan; sərrast atıcı
**marksmanship** ['ma:ksmənʃɪp] *n* mahir atıcılıq, atıcılıq sənəti/məharəti
**marmalade** ['ma:məleɪd] *n* marmelad
**marmoreal** [ma:'mɔ:rɪəl] *adj şair.* mərmər, mərmər kimi
**Marmara Sea** ['ma:mərəsi:] *n* Mərmərə dənizi
**marmoset** ['ma:məzet] *n zool.* tropik amerikan meymunu

**marmot** ['ma:mət] *n zool.* marmot *(kiçik gəmirici heyvan)*
**marocain** ['mærəkeın] *n* maroken, tumac *(kitab cildi üçün)*
**maroon**[1] [mə'ru:n] *adj* qəhvəyi-qırmızı *(rəng haq.)*
**maroon**[2] [mə'ru:n] *v* **1.** aparıb kimsəsiz səhraya buraxmaq; **2.** köməksiz/tək-tənha qoyub getmək
**marquee** ['ma:ki:] *n* böyük çadır/alaçıq, xeymə
**marquetry** ['ma:kıtrı] *n* oymaçılıq *(dekorativ sənətdə: taxta və ya dəmir üzərində oyma yolu ilə açılan naxış)*
**marquis, marquess** ['ma:kwıs] *n* markiz
**marriage** ['mærıdʒ] *n* **1.** evlənmə, izdivac, kəbin; nikah; *A marriage has been arranged between Anar and Leyla Anarla Leyla arasında kəbin kəsilib*; **to take smb. in ~** bir kəsi almaq, bir kəslə evlənmək, bir kəsə ərə getmək; **2.** toy mərasimi
**marriageable** ['mærıdʒəbl] *adj* evlənmə yaşına/həddi-büluğa çatmış
**married** ['mærıd] *adj* ailə qurmuş; evlənmiş, evli, ailəli; ~ **life** evli həyat, ər-arvadlıq; ~ **couples** ər-arvad
**marrow** ['mærou] *n* I *bot.* yunan balqabağı/kudusu
**marrow** ['mærou] *n* II **1.** sümük iliyi; **2.** *məc.* ilik, sümük; **to be chilled to the ~** sümüyünə /iliyinə qədər üşümək; **3.** mahiyyət; məğz; sözün canı; əsas mətləb
**marry** ['mærı] *v* **1.** ailə qurmaq; evlənmək; *John is going to marry Jane Con Ceynlə ailə qurur; The girl married the boy against her will Qız iradəsinin əksinə olaraq oğlana ərə getdi; She married to get away from her tyranical mother O, zülmkar anasından yaxa qurtarmaq üçün ərə getdi*; **2.** nikah/kəbin kəsmək; *Which priest is going to marry them? Onların kəbinini hansı keşiş kəsəcək?*; **3.** ərə vermək; evləndirmək; *He married both his daughters to rich persons O hər iki qızını varlı adamlara ərə verdi; He has married off all her daughters O bütün qızlarını ərə verib*; **4.** evlənmək yolu ilə var-dövlət əldə etmək; var-dövlətə görə evlənmək/ərə getmək; **to ~ money/wealth** pullu/varlı adama ərə getmək
**Mars** [ma:z] *n* **1.** Mars *(yunan əsatirində: müharibə Allahı)*; **2.** *astr.* Mars planeti *(günəş sistemində IV planet)*
**Marsala** [ma:'sa:lə] *n* Marsala *(Siciliyanın Marsala vilayətində istehsal olunan şirin çaxır)*
**Marseillaise** [,ma:sə'leız] *n* Marselyoza *(Fransanın milli himni)*
**marsh** [ma:ʃ] *n* bataqlıq, bataq yer
**marshal**[1] ['ma:ʃl] *n* **1.** marşal; **Field Marshal** feldmarşal *(orduda)*; **Air Marshal** hava donanması marşalı; **2.** ictimai məsuliyyət daşıyan xadim; **3.** şerifin vəzifəsini icra edən şəxs; **4.** *yanğınsöndürmə polisinin və ya polis bölməsinin rəisi*

**marshal**[2] ['ma:ʃl] *v* **1.** sıraya düzülmək; **2.** sıraya/cərgəyə düzmək; **3.** yerlərində oturtmaq, yerbəyer etmək *(ziyafətdə və s.)*; **to ~ military forces** hərbi qüvvələri nizamlamaq /qaydaya salmaq
**Marsh Mallow** ['ma:ʃmelou] *n* **1.** zefir; **2.** zefirdən hazırlanmış pambıq kimi yumşaq şişirdilmiş şirniyyat
**marshy** ['ma:ʃı] *adj* bataqlıqlı
**marsupials** [ma:'su:pıəlz] *n* kisəlilər *(balasını gəzdirmək üçün kisəsi olan heyvanlar; kenquru tipli)*
**mart** [ma:t] *n* **1.** *şair.* bazar; ticarət şəbəkəsi; **2.** hərrac keçirilən otaq; hərracxana
**marten** ['ma:tın] *n* **1.** *zool.* dələ; dələ dərisi; **2.** su samuru
**martial** ['ma:ʃıəl] *adj* **1.** hərbi, döyüşkən; ~ **law** hərbi vəziyyət qanunu; ~ **music** hərbi musiqi; **to be under ~ law** hərbi vəziyyət qanunları altında yaşamaq/fəaliyyət göstərmək; **to impose/to declare ~ law** hərbi vəziyyət tətbiq/elan etmək; **2.** döyüş ruhu, cəsurluq; **to show ~ spirit** yüksək döyüş ruhu nümayiş etdirmək
**martially** ['ma:ʃıəlı] *adv* **1.** hərbi şəkildə; **2.** cəsurcasına; cəsurluqla; yüksək döyüş ruhu ilə; *They were fighting martially Onlar yüksək döyüş ruhu ilə vuruşurdular*
**Martian** ['ma:ʃən] *adj* Marslı
**martin** ['ma:tın] *n zool.* mart quşu
**martinet** [,ma:'tınıt] *n* **1.** ciddi intizam yaradan şəxs; **2.** güclü intizam tərəfdarı; **3.** tərbiyəsiz /kobud adam
**martini** [,ma:'tını] *n* cin *(ağ şərabdan hazırlanmış kokteyl)*
**martyr**[1] ['ma:təʳ] *n* şəhid; *He died a martyr in the fight against Armenians for Garabagh O, Qarabağ uğrunda ermənilərə qarşı döyüşdə şəhid oldu*; **to make a ~ of oneself** özünü məzlum/əzabkeş adam kimi göstərmək; **to be a ~ to smth.** bir şeyə düçar/mübtəla olmaq
**martyr**[2] ['ma:təʳ] *v* şəhid olmaq; özünü şəhid etmək
**martyrdom** ['ma:tədəm] *n* şəhidlik
**marvel**[1] ['ma:vl] *n* **1.** cazibədar əşya; sehr, möcüzə; **the ~s of modern science** müasir elmin möcüzələri; **to work ~s** möcüzələr/ xariqələr yaratmaq; **2.** ecazkarlıq nümunəsi; *She is a marvel of patience O əsl səbir/ dözüm nümunəsidir*
**marvel**[2] ['ma:vl] *v* riqqətə gəlmək, məftun olmaq; bərk təəccüblənmək; **to ~ at smb.'s boldness** bir kəsin məğrurluğuna məftun olmaq; *I marvel that... Təəccüb edirəm ki...; I marvel that she should agree to marry that man Mən inanmıram ki, o bu adama ərə getməyə razılıq versin*
**marvellous** ['ma:vələs] *adj* çox gözəl/qəşəng, ecazkar, fövqəladə, valehedici, son dərəcə gözəl/qəşəng
**marvellously** ['ma:vələslı] *adv* çox gözəl/qəşəng, son dərəcə gözəl/qəşəng



**marxism** ['ma:ksızm] *n fəls.* marksizm *(fəlsəfi cərəyan)*
**mascot** ['mæskət] *n* tilsim *(bəxt açan)*
**masculine** ['mæskjuli:n] *adj* **1.** kişi cinsinə aid olan; **2.** kişisayağı, kişi kimi, kişi xasiyyətli; **a ~ woman** kişi kimi/kişi xasiyyətli qadın
**masculinity** [,mæskju'lınətı] *n* kişilik, kişiyanalıq
**maser** ['meızəʳ] *n tex.* mazer *(maddənin atomlarını və qazları nazik axınla xaric edən cihaz)*
**mash**[1] [mæʃ] *n* **1.** əzmə; horra; **2.** yumşaldılmış və əzilmiş maddə
**mash**[2] [mæʃ] *v* əzmək, horra/püre halına salmaq
**masher** ['mæʃəʳ] *n* qiyməkeş, həvəngdəstə
**mask**[1] [ma:sk] *n* **1.** maska, pərdə; **to do smth. under the ~ of a (the) friendship** dostluq pərdəsi altında iş görmək; **to throw off one's ~** maskasını çıxartmaq, özünün əsl niyyətini büruzə vermək; **2.** örtük, qoruyucu geyim; əleyhqaz; **3.** ağıza bağlanan sterilizə edilmiş tənzif
**mask**[2] [ma:sk] *v* **1.** maska geymək/taxmaq; **2.** *məc.* maskalamaq; ört-basdır etmək; **to ~ one's enmity under an appearance of friendliness** dostluq pərdəsi altında öz düşmənçiliyini maskalamaq/ört-basdır etmək
**masked** [ma:skt] *adj* **1.** maska geymiş, maskalanmış; **a ~ woman** maska geymiş qadın; **2.** gizli; ~ **smile** gizli təbəssüm; ~ **door** gizli qapı
**masochism** ['mæsəkızəm] *n* sadizm, masokizm *(bir kəsin ağrı və iztirablarından ləzzət alma)*
**masochist** ['mæsəkıst] *n* sadist
**mason** [meısn] *n* **1.** bənna; **2.** mason *(yəhudi təşkilatı)*
**masonic** [mə'sɔnık] *adj* masonçu *(mason təşkilatına aid olan)*
**masonry** ['meısnrı] *n* **1.** daş işi; hörgü; **2.** masonçuluq
**masque** [ma:sk] *n* **1.** masqara *(şerlə yazılmış dram əsərinin tamaşası)*; **2.** maskarad
**masquerade**[1] [,mæskə'reıd] *n* bal-maskarad
**masquerade**[2] [,mæskə'reıd] *v* **1.** bal-maskaradda maska geyinib/taxıb oynamaq; **a prince who ~d as a peasant** kəndli maskası geymiş şahzadə; **2.** maskalanmaq, özünü ... göstərmək/... oxşatmaq/... qoymaq
**mass**[1] [mæs] *n* I massa, kütlə; toplu, topa; **~es of dark clouds in the sky** göydə qara buludların topası; **a great ~ of people** çoxlu insan kütlələri; **the ~es** xalq kütlələri; proletariat; **in the ~** bütövlükdə; *The nation in the mass was not interested in politics Bütövlükdə millət siyasətlə maraqlanmırdı*; **the ~ meeting** kütləvi mitinq
**mass** [mæs] *n* II **1.** obednya *(xristianlarda sübh və ya günorta ibadəti)*; **2.** katolik ibadəti və ya bu ibadət zamanı çalınan musiqi; **solemn ~** təntənəli dini mərasim; **to go to ~** ibadətə getmək; **to hear ~** ibadəti dinləmək; *Masses were said for peace in the world Dünyada sülh üçün dualar oxundu*

**mass**[2] [mæs] *adj* kütləvi; ictimai; ~ **meeting** kütləvi mitinq; ~ **media** kütləvi informasiya vasitələri; mətbuat; ~ **produce** kütləvi istehsal
**mass**[3] [mæs] *v* kütləvi şəkildə toplamaq/ toplaşmaq; cəm olmaq; *The clouds are massing Buludlar toplaşır; The people are massing on the square Adamlar meydana toplaşır*
**massacre**[1] ['mæsəkəʳ] *n* qətl, kütləvi qırğın, qətlə yetirmə, soyqırım
**massacre**[2] ['mæsəkəʳ] *v* vəhşicəsinə öldürmək; kütləvi şəkildə qırmaq/qətlə yetirmək
**massage**[1] ['mæsa:ʒ] *n* masaj; ovxalama; ovuşdurma
**massage**[2] ['mæsa:ʒ] *v* masaj etmək; ovxalamaq; ovuşdurmaq
**massif** ['mæsıf] *n* massiv *(dağın yüksək zirvələri)*; **mountain ~** dağ massivi
**massive** ['mæsıv] *adj* **1.** massiv; bərk; möhkəm; möhtəşəm; ~ **monument** möhtəşəm abidə; **2.** iri; yekəpər, böyük; **a ~ forehead** iri alın
**massively** ['mæsıvlı] *adv* ciddi, ağır, təmkinli, möhkəm
**massiveness** ['mæsıvnıs] *n* əzəmətlilik, möhtəşəmlik; böyüklük
**mast** [ma:st] *n* I **1.** dor ağacı *(gəmidə, qayıqda)*; **2.** şaquli vəziyyətdə dayanmış dirək; **to sail before the ~** adi dənizçi kimi xidmət etmək; **3.** bayraq asmaq üçün hündür dirək; **4.** teleradio qülləsi
**mast** [ma:st] *n* II *biol.* fıstıq/palıd qozası *(meşədə bitən digər ağacların qidalı meyvələri)*
**master**[1] ['ma:stəʳ] *n* **1.** ağa; sahibkar; **to be one's own ~** özü özünün ağası olmaq; **2.** ustad; usta; **3.** kişi, başçı *(evdə, ailədə)*; **the ~ of the house** evin böyüyü/ağası; **to be ~ in one's own house** öz evinin böyüyü/ağası olmaq; **4.** ticarət gəmisinin kapitanı; **to obtain a ~'s certificate** ticarət gəmisinin kapitanı şəhadətnaməsini almaq; **5.** müəllim; **school ~** kişi müəllimi *(məktəbdə)*; **a dancing/fencing ~** rəqs/qılıncoynatma müəllimi; **6.** yiyə; sahib; *He is master of the situation O, vəziyyətə nəzarət edir; I wish I could be master of this subject Kaş mən bu fənni dərindən mənimsəyəydim; He has made himself master of the language O, dilə dərindən yiyələnib; You cannot be the master of your fate Sən/Siz taleyinin/taleyinizin sahibi ola bilməzsən/bilməzsiniz*; **7. the Master** İsa peyğəmbər; **8.** xadim; **Master of Arts/ Sciences** *etc.* humanitar elmlər/təbiət elmləri üzrə magistr *və s.*; **9.** incəsənət ustaları; **10.** rəsmi titul; **Master of House** ali cəmiyyətə mənsub olan şəxs; məişətdə ev işlərinə rəhbərlik edən şəxs; **Master of ceremonies** mərasimlərin təşkilatçısı
**master**[2] ['ma:stəʳ] *adj* usta, ustad; təcrübəli; **a ~ carpenter** usta/təcrübəli dülgər; **a ~ builder** usta/təcrübəli inşaatçı
**master**[3] ['ma:stəʳ] *v* **1.** üstün gəlmək; cilovlamaq; ağası olmaq; **to ~ one's temper** özünü ələ al-

maq; **to ~ *one's* feelings** hisslərini cilovlamaq; 2. mənimsəmək, yiyələnmək, sahib olmaq, dərindən öyrənmək; **to ~ a foreign language** xarici dili yaxşı mənimsəmək; **to ~ a saxophone** yaxşı saksafon çalmağı öyrənmək

**masterless** ['ma:stəlɪs] *adj* sahibsiz, yiyəsiz

**masterly** ['ma:stəlɪ] *adv* 1. mükəmməl surətdə; 2. ustalıqla, məharətlə, bacarıqla

**masterpiece** ['ma:stəpi:s] *n* şah əsər

**mastership** ['ma:stəʃɪp] *n* 1. başçılıq; 2. ustalıq, sənətkarlıq; 3. müdirlik *(məktəbdə)*

**mastery** ['ma:stərɪ] *n* 1. tam nəzarət etmə; cilovlama; ram etmə; **to get ~ of a wild horse** vəhşi atı ram etmək; 2. üstünlük; *Which side will get the mastery Hansı tərəf üstünlüyü ələ keçirəcəkdir?/alacaqdır?*

**masterwork** ['ma:stəwə:k] *n* = **masterpiece**

**masticate** ['mæstɪkeɪt] *v* çeynəmək

**mastication** [.mæstɪ'keɪʃn] *n* çeynəmə; əzmə *(dişlə)*

**mastiff** ['mæstɪf] *n* iz axtaran it; tula *(uzun qulağı olan)*

**masturbate** ['mæstəbeɪt] *v* onanizm/kəfləmə etmək; kəfləmə vurmaq

**masturbation** [.mæstə'beɪʃn] *n* onanizm; kəfləmə

**mat**[1] [mæt] *n* 1. ayaqaltı; palaz *(həsirdən, ipdən, yundan və s. toxunmuş)*; 2. altlıq *(isti qabın, qazanın və s. altına qoymaq üçün)*

**mat**[2], **matt, matte** [mæt] *adj* cilalanmamış; donuq; tutqun; **~ glass** donuq şüşə

**mat**[3] [mæt] *v* 1. örtmək, döşəmək *(həsirlə)*; 2. örtmək, bürümək *(qışda: bitkini)*

**matador** ['mætədɔ:ʳ] *n* matador *(buğa döyüşündə baş döyüşçü)*

**match**[1] [mætʃ] *n* I kibrit, spiçka; **to strike a ~** spiçka/kibrit yandırmaq; **a box of ~es** bir qutu spiçka/kibrit

**match** [mætʃ] *n* II 1. yarış; **a football ~** futbol yarışı; **a wrestling ~** güləş yarışı; **a boxing ~** boks yarışı; **to win a ~** yarışı udmaq; 2. tay; bərabər; **to find/to meet *one's* ~** öz tayını tapmaq; *He is up against more than this match O özündən çox-çox güclü adamla qarşılaşır; You are no match for him Sən/Siz onun tayı deyilsən/deyilsiniz*; 3. evlənmə; ailə qurma; *They decided to make a match of it Onlar evlənməyi qərara aldılar*; 4. ər və ya arvad; *He is a good match O yaxşı ərdir*; 5. uyğunluq; mütənasiblik; yaraşma; *White shoes are a good match for black trousers Ağ ayaqqabı qara şalvara yaxşı yaraşır*

**match**[2] [mætʃ] *adj* spiçka, kibrit; **a ~ box** kibrit/spiçka qutusu; **a ~ wood** kibrit/spiçka istehsalı üçün yararlı ağac

**match**[3] [mætʃ] *v* 1. yarışmaq, yarışda sınaqdan keçirmək; **to ~ with *smb.*** bir kəslə yarışmaq; *I am ready to match my strength with/against yours Mən gücümü səninlə/ sizinlə yoxlamağa hazıram*; 2. tay/ bərabər olmaq; *Boxers match each other Boksçular bir-birinə taydır; No one can match him in archery Ox atmaqda heç kim ona tay ola bilməz*; 3. uyğun gəlmək; yaraşmaq *(rəng, geyim və s. haq.); The carpets should match the curtains Xalçalar gərək pərdələrə uyğun gəlsin/ yaraşsın; She was wearing a brown dress with hat and gloves to match O, əlcək və şlyapasına yaraşan qonur rəngli paltar geyinirdi*; 4. yaraşdırmaq, uyğunlaşdırmaq

**match lock** ['mætʃlɔk] *n* muşket *(qədimdə lüləsi uzun tüfəng)*

**mate**[1] [meɪt] *n* I *d.d.* 1. dost; yoldaş; iş yoldaşı; **class ~** sinif yoldaşı; **play ~** oyun yoldaşı; 2. gəmi kapitanının köməkçisi; 3. köməkçi; **the cook's ~** aşbaz köməkçisi; **surgeon's ~** cərrah köməkçisi; 4. heyvan və quşlarda cütlərdən biri; 5. *d.d.* ər və ya arvad; *She has been a faithful mate to him O ona sədaqətli arvaddır*

**mate** [meɪt] *n* II şah və mat *(şahmatda)*

**mate**[2] [meɪt] *v* **(with)** *d.d.* cütləşmək; cütləşdirmək *(heyvanlarda)*; **the mating season** cütləşmə vaxtı; *The camels in the zoo have not been mated this year Zooparkdakı dəvələr bu il cütləşdirilməyiblər*

**material**[1] [mə'tɪərɪəl] *n* 1. material; **raw ~s for industry** sənaye üçün xam material; **building ~s** tikinti materialları; 2. ləvazimat; **writing ~s** yazı ləvazimatları; 3. parça; **cotton/ woolen ~** pambıq/yun parça; 4. məlumat, material, dəlil, sübut; *She's collecting material for a newspaper article O, qəzet məqaləsi üçün material/məlumat toplayır*

**material**[2] [mə'tɪərɪəl] *adj* 1. material; maddi; **the ~ world** maddi aləm; **a ~ noun** maddi/ konkret isim; **~ needs** maddi ehtiyaclar; 2. *hüq.* maddi, əsaslı, vacib; əhəmiyyətli; **~ evidence/ testimony** maddi dəlil/sübut; *The judge warned the witness not to hold back material facts Hakim şahidə xəbərdarlıq etdi ki, o heç bir maddi dəlili gizlətməsin; Is this point material to your argument? Bu cəhət sənin/sizin fikrin/fikriniz üçün bir əhəmiyyət kəsb edirmi?*

**materialism** [mə'tɪərɪəlɪzm] *n* materializm *(fəlsəfi nəzəriyyə)*

**materialist** [mə'tɪərɪəlɪst] *n* materialist

**materialistic** [mə'tɪərɪəlɪstɪk] *adj* materialist; **~ idea** materialist fikir/ideya

**materialistically** [mə'tɪərɪəlɪstɪkəlɪ] *adv* materialist, materialistcəsinə; **to approach the problem ~** problemə materialist/ materialistcəsinə yanaşmaq

**materialization, -sation** [mə'tɪərɪəlaɪ'zeɪʃn] *n* həyata keçmə/keçirmə, reallaşma

**materialize, -ise** [mə'tɪərɪəlaɪz] *v* maddiləşmək, gerçəkləşmək; maddiləşdirmək, gerçəkləşdirmək; həyata keçmək/keçirmək, reallaşdırmaq; *Our plans did not materialize Bizim planlarımız həyata keçmədi*

**maternal** [mə'tə:nl] *adj* ana; analıq; **~ care** ana/analıq qayğısı; **~ instinct** analıq instinkti; **my ~ grandfather** ana tərəfdən olan babam; ana babam



**maternally** [mə'tə:nəlɪ] *adv* ana kimi; ana tərəfdən

**maternity** [mə'tə:nɪtɪ] *n* analıq; hamiləlik; **~ leave** analıq məzuniyyəti; **~ home** doğum evi

**matey** ['meɪtɪ] *adj d.d.* qaynayıb qarışan; adama uyuşan

**mathematical** [.mæθə'mætɪkl] *adj* riyazi; **~ analysis** riyazi analiz

**mathematically** [.mæθə'mætɪklɪ] *adv* riyazi cəhətdən/baxımdan

**mathematician** [.mæθəmə'tɪʃn] *n* riyaziyyatçı

**mathematics** [.mæθə'mætɪks] *n* riyaziyyat *(cəbr, hesab, triqonometriya və həndəsə); Mathematics is his weak subject Onun zəif bildiyi fənn riyaziyyatdır*

**maths, math** [mæθ] = **mathematics**

**matinee** ['mætɪneɪ] *n* gündüz tamaşası *(kino və ya teatrda)*; **~ idol** pərəstiş edilən aktyor

**matins** ['mætɪnz] *n* sübh ibadəti *(İngiltərədəki kilsələrdə)*

**matriarch** ['meɪtrɪa:k] *n* matriarx *(ailə və ya qəbilədə qadın hökmdarlığı)*

**matriarchy** ['meɪtrɪa:kɪ] *n* matriarxat, madərşahlıq

**matriarchal** ['meɪtrɪa:kl] *adj* matriarxal; **~ society** matriarxal cəmiyyət

**matric** [mə'trɪk] *n d.d.* **matriculation** *sözünün qısa forması*

**matricide** ['mætrɪsaɪd] *n* bir kəsin öz anasını öldürməsi/qətlə yetirməsi

**matriculate** [mæ'trɪkjuleɪt] *v* imtahan verdikdən sonra universitetə qəbul olmaq /olunmaq

**matriculation** [mæ.trɪkju'leɪʃn] *n* 1. ali məktəbə qəbul etmə/qəbul imtahanı vermə; 2. universitetə qəbul etmə/olunma

**matrimonial** [.mætrɪ'mounɪəl] *adj* ailə, ər-arvad; **~ troubles** ailə çətinlikləri

**matrimony** ['mætrɪmənɪ] *n* ailə; nikah; ailə vəziyyəti

**matron** ['meɪtrən] *n* 1. xadimə *(müəssisə və s.)*; 2. xəstəxanada təsərrüfat müdiri; 3. müəyyən sosial nüfuza malik olan qadın; **styles suitable for ~s** qadınlar üçün olan dəb/moda

**matronly** ['meɪtrənlɪ] *adj* qadınlara yaraşan/aid olan

**matt** [mæt] *adj* = **mat**[2]

**matted** ['mætɪd] *adj* dolaşmış, pırtlaşıq, dolaşıq /pırtlaşıq düşmüş *(saç və s. haq.)*

**matter**[1] ['mætəʳ] *n* 1. maddə; **organic/ inorganic ~** üzvü/qeyri-üzvi maddə; 2. tərz; vasitə, düşüncə/ifadə vasitəsi; 3. yazılı və ya çap edilmiş material; **reading ~** oxu materialı/kitabı; **postal ~** poçtla göndərilən şey; 4. diqqətəlayiq şey; iş; məsələ; **money ~s** pul məsələsi; *This is a matter I know little about Bu mənim az bildiyim məsələdir; There are several matters to be dealt with at the committee meeting Komitənin iclasında müzakirə edilməli/baxılmalı bir sıra məsələlər vardır*; **as a ~ of fact** faktiki olaraq; əslində; **for the ~ of that** bu məsələ ilə əlaqədar olaraq...; *He is strict in the matter of discipline O, intizam məsələsində çox tələbkardır/ciddidir*; **a hanging ~** asılmaqla ölüm işi *(cinayətə görə); No laughing matter Gülməli məsələ deyil; No matter, It makes no matter Eybi yoxdur; It is no matter Eyb etməz; It makes no matter whether you arrive early or late Sənin/Sizin tez və ya gec gəlib çatmağının/çatmağınızın məsələyə heç bir dəxli yoxdur; No matter who... Kim olursa olsun...; No matter what... Nə olursa olsun...; Don't trust him no matter what he says O, nə deyirsə desin, ona inanma; Don't believe the rumour, no matter who repeats it Şayiəni kimin danışmasına baxmayaraq, inanma; What's the matter with it? Ona nə olubdur ki!*; 6. iş; **~ of peace** sülh işi; **a ~ of** təxminən; *It's the job a matter of ten days Bu təxminən on günün işidir*

**matter**[2] ['mætəʳ] *v (adət. sual və inkar cümlələrdə işlənir)* əhəmiyyət kəsb etmək; məna vermək, mənalanmaq; *What does it matter? Bunun mənası nədir? It doesn't matter much Bu elə çox əhəmiyyət kəsb etmir; It hardly matters at all Demək olar, bunun heç bir əhəmiyyəti/mənası yoxdur; It doesn't matter to me what you do or where you go Sənin/Sizin nə etməyinin/etməyinizin və haraya getməyinin/getməyinizin mənim üçün heç bir əhəmiyyəti* /mənası yoxdur

**matting** ['mætɪŋ] *n* həsir, döşəməyə sərilən cod əski

**mattock** ['mætək] *n* külüng; kərki, toxa

**mattress** ['mætrɪs] *n* döşək; **spring ~** yaylı döşək

**maturate** ['mætjureɪt] *v* yetişmək; istifadə üçün yararlı vəziyyətə gəlib çatmaq

**maturation** [.mætju'reɪʃn] *n* 1. yetişmə, tam inkişaf etmə; 2. *tib.* yetişmə, irinləmə

**mature**[1] [mə'tjuəʳ] *adj* dolğun; yetkin, yetişmiş, kamil; **after ~ plans** dolğun/kamil planlardan sonra

**mature**[2] [mə'tjuəʳ] *v* yetişmək, dolğunlaşmaq; *His character matured during these years O bu illər ərzində kamilləşdi/yetişdi; This wine has not matured properly Bu şərab tam yetişməyib*

**maturely** [mə'tjuəlɪ] *adv* dolğun şəkildə/ tərzdə; yetkin şəkildə/tərzdə

**maturity** [mə'tjuərɪtɪ] *n* yetkinlik, dolğunluq; vədə

**matutinal** [.mætju:'taɪnl] *adj* səhər, erkən

**maul** ['mɔ:l] *v* şikəst etmək, dağıtmaq; incitmək; ağrıtmaq; *Stop mauling the cat Pişiyi incitmə/incitməyin*

**maunder** ['mɔ:ndəʳ] *v* kəkələyə-kəkələyə/ rabitəsiz/qırıq-qırıq danışmaq

**Maundy Thursday** ['mɔ:ndɪ'θə:zdɪ] *n* Pasxa bayramından qabaqkı çərşənbə axşamı

**mausoleum** [.mɔ:sə'lɪəm] *n* mavzoley, məqbərə

**mauve** ['mouv] *adj* çəhrayı-bənövşəyi *(rəng)*
**maverick** ['mævərık] *n* **1.** damğalanmamış buzov; **2.** qanun-qaydaya tabe olmayıb təkbaşına hərəkət edən adam
**mavis** ['meıvıs] *n* oxuyan qaratoyuq
**maw** [mɔ:] *n* **1.** qarın; **2.** qursaq, şirdan *(heyvanlarda)*
**mawkish** ['mɔ:kıʃ] *adj* **1.** sentimental; gözüyaşlı, ağlar, ağlayan; **2.** şit, duzsuz; əttökən
**maxi** ['mæksı] *pref* maksi *(uzun)*
**maxim** ['mæksım] *n* **1.** prinsip, əxlaq qaydası; **2.** aforizm; zərbi-məsəl; hikmətli söz
**maximization** [,mæksımaı'zeıʃn] *n* maksimum həddə çatdırma
**maximize** ['mæksımaız] *v* maksimum səviyyəyə çatdırmaq; **to ~ educational opportunities** təhsilin imkanlarını maksimum səviyyəyə çatdırmaq
**maximum** ['mæksıməm] *n adj* maksimum; **to the ~** maksimum səviyyəyə; *This costs a maximum of 1000 manats Bu, maksimum 1000 manata dəyər; The maximum load for this lorry is one ton Bu yük maşını maksimum bir ton yük götürə bilər*
**May** [meı] *n* may *(ilin beşinci ayı)*; **in ~** mayda, may ayında
**may** [meı] *v (pt; pp* **might** [maıt]) I *Modal fel olaraq aşağıdakı mənaları ifadə edir;* **1.** güman/ehtimal/ola bilsin ki,...; *It may rain Güman ki, yağış yağacaq; He may not be hungry Güman ki/Ola bilsin ki, o ac deyildir; He may miss the train Ola bilsin ki, o, qatara geciksin; She may have lost the bag Ola bilsin ki, o, çantanı itirib; He may have fallen ill Ola bilsin ki/Güman ki, o xəstələnib;* **2.** şübhə, inamsızlıq; *Who may you be? Siz kimsiniz?; It may be true Bu bəlkə də düzdür; It may not be true Bu həqiqət ola bilməz; It may have been true Bəlkə də bu düzdür;* **3.** *sual cümlələrində xahiş: May I ask you a question? Səndən/Sizdən bir sual soruşmaq olarmı?; May I come in? İçəri gəlmək olarmı?* **4.** *təsdiq cümlədə icazə:* əgər, mümkün olsa; *I shall call you tomorrow if I may Əgər mümkün olarsa, sabah sənə/ sizə baş çəkərəm; You may stay if you want to Əgər istəsən/istəsəniz qala bilərsən/ bilərsiniz; You may smoke here Burada papiros çəkə bilərsən/bilərsiniz;* **5.** *nida cümləsində:* arzu, dilək; *May you be happy! Səni/Sizi xoşbəxt olasan!/olasınız! May he live long! Onun ömrü uzun olsun!; May you live to see this happy day! Görüm səni/sizi o qədər yaşayasan/yaşayasınız ki, bu xoşbəxt günü görəsən/görəsiniz!;* **6.** *Qanun, hüquqla bağlı mətnlərdə:* vaciblik; *No replacement may take place during a trial Məhkəmə vaxtı heç bir dəyişiklik etmək olmaz*
**may** [meı] *v (pt; pp* **might** [maıt]) II *Köməkçi fel kimi felin arzu şəklini düzəltmək üçün işlənir:* **1.** *ümid, qorxu, əndişə, ehtiyat və s. mənalar bildirən fellərdən sonra; I hope he may (might) succeed Ümidvaram ki, o, uğur /müvəffəqiyyət qazanacaq; They hope he may soon recover Onlar ümidvardırlar ki, o tezliklə sağalacaq; They fear he may lose his way Onlar qorxurlar ki, o yolunu azsın;* **2. that, so that** *bağlayıcılarından sonra; So that he may know in time O, vaxtında bilsin deyə; He wrote the address down (so) that he might not forget it O, ünvanı yazdı ki, onu unutmasın;* **3. whatever, however** *və s. sözlərindən sonra: Whatever he may say, I shall not believe him O, nə deyirsə desin, mən ona inanmaram*
**maybe** ['meıbı] *adv* ola bilsin ki,...; güman ki,...; *Maybe we'll meet him Ola bilsin ki, biz onunla görüşək*
**may beetle** ['meıbi:tl] *n zool.* = **may bug**
**may bug** ['meıbʌg] *n zool.* may böcəyi
**May Day** ['meıdeı] *n* 1 May *(bayram: beynəlxalq həmrəylik günü)*
**mayfly** ['meıflaı] *n zool.* may milçəyi *(qısaömürlü həşərat)*
**mayhem** ['meıhem] *n* şikəst/şil-küt/əzik-üzük etmə; **to cause ~** şil-küt etmək; **to commit ~ on** *smb.* bir kəsi şil-küt etmək
**mayonnaise** [,meıə'neız] *n* mayonez *(yumurta sarısı, zeytun yağı, sirkə və ədviyyatdan hazırlanmış sous)*
**mayor** ['meəʳ] *n* bələdiyyə rəisi
**mayoralty** ['meərəltı] *n* bələdiyyə idarəsi
**mayoress** ['meərıs] *n* bələdiyyə rəisi *(qadın)*
**may pole** ['meıpoul] *n* may ağacı *(may ayının 1-də İngiltərədə ətrafında rəqs etmək üçün gül-çiçəklə bəzədilmiş dirək)*
**maze** [meız] *n* labirint; çıxılmaz yer; **a ~ of narrow alleys** çıxışı olmayan dar küçələr/xiyabanlar; **to be in a ~** dolaşmaq, çaşmaq, dolaşıb qalmaq; azmaq *(yolu)*
**mazed** [meızd] *adj* çaşmış, azmış; özünü itirmiş; çaş-baş qalmış
**mazurka** [mə'zə:kə] *n* mazurka *(polyak rəqs havası)*
**me¹** [mi:] *pron (tam forması)*; [mı] *(qısa forması) I şəxs əvəzliyinin obyekt halı:* **1.** mənə, məni; *Tell me Mənə de/deyin; Meet me Məni qarşıla/qarşılayın; They invited me to the evening party Onlar məni axşam qonaqlığına dəvət etdilər; They are talking about me Onlar mənim haqqımda danışırlar;* **2.** *d.d.* mən; *It's me Bu mənəm (rəsmi dildə isə It is I);* **3.** özüm
**me²** [mi:] *refl. pron (tam forması)*; [mı] *(qısa forması)*; özümlə *(bəzən tərcümə edilmir); I took the dog with me Mən iti özümlə apardım; I shut the door after me Mən qapını arxamca bağladım*
**mead** [mi:d] *n* acıdılmış baldan düzəldilmiş alkoqollu içki
**meadow** ['medou] *n* çəmənlik, otlaq
**meadow lark** ['medoula:k] *n* çəmənlik torağayı *(Şimali Amerikada yaşayan nəğmə oxuyan quşlar sinfindən)*



**meagre,** *amer.* **meager** ['mi:gəʳ] *adj* **1.** nazik; arıq; bir dəri bir sümük; **a ~ face** arıq sifət; **2.** zəif; kasıb; az; **a ~ meal** cüzi (az) yemək; **a ~ fare** cüzi/az yol xərci
**meagerly** ['mi:gəlı] *adv* kasıb, az, məhdud, kasıblıqla; güc-bəla ilə; **to live ~** kasıb/güc-bəla ilə yaşamaq
**meagerness** ['mi:gənıs] *n* kasıblıq; kiçiklik, azlıq; arıqlıq
**meal¹** [mi:l] *n* I **1.** yemək; **three ~s a day** gündə üç (dəfə) yemək; *Breakfast is the first meal of the day Səhər yeməyi günün birinci yeməyidir;* **2.** qida; ərzaq; *Have a good meal! Nuş/Afiyyət olsun!*
**meal** [mi:l] *n* II yarma; **oat ~** yulaf yarması
**meal²** [mi:l] *v* **1.** qida qəbul etmək, yemək; **2.** yedirtmək
**mealtime** ['mi:ltaım] *n* yemək vaxtı
**mealy** ['mi:lı] *adj* **1.** un, unlu, un səpilmiş; **2.** kövrək, tez ovulan *(kartof haq.)*
**mealy-mouthed** ['mi:lımauðd] *adj* **1.** şirindil, şirindilli, şirindanışan; **2.** sözünü açıq/açıq-açığına deməkdən çəkinən
**mean¹** [mi:n] *n* **1.** orta hədd; ortalıq; **2.** *riyaz.* orta kəmiyyət
**mean²** [mi:n] *adj* I **1.** xəsis; *He is mean with his money O, pul xərcləməyə xəsisdir;* **2.** kasıb; köhnə; **a ~ house** kasıb ev; **3.** şərəfsiz; ləyaqətsiz; qanacaqsız; *It was mean of you to eat all the peaches Bütün şaftalıları yeməkdə qanacaqsızlıq etdin/etdiniz; What a mean revenge! Necə də şərəfsiz intiqam!;* **4.** rəhmsiz, daşürəkli, qəddar; *Don't be so mean to your little brother Balaca qardaşına/ qardaşınıza qarşı belə qəddar olma/olmayın; He is a mean-minded sort of man O, kinli/ kinsaxlayan adamdır;* **5.** sadə; adi; *This should be clear even to the meanest intelligence Bu ən adi ağıl sahibinə də aydın olmalıdır; He is not a mean scholar O adi alim deyil;* **6.** çəkinən; utanan; *I feel rather mean for not helping her more Mən ona daha çox kömək edə bilmədiyimə görə xəcalət çəkirəm;* **7.** bədxah; bədniyyət; *He is a really mean fellow-he likes to see people suffer O həqiqətən də bədxah insandır; O, insanların iztirab çəkməsini xoşlayır*
**mean** [mi:n] *adj* II orta; orta kəmiyyət; **the ~ annual temperature in Azerbaijan** Azərbaycanda illik orta temperatur/hərarət; **the ~ price** orta qiymət
**mean³** [mi:n] *v (pt, pp* **meant** [ment]) **1.** məna vermək; ifadə etmək; *A dictionary tries to tell you what words mean Lüğət sizə sözlərin nə məna ifadə etdiyini göstərməyə çalışır; The latin word "amo" means "I love" Latın sözü "amo" "Mən sevirəm" deməkdir; This new frontier incident means war Bu yeni sərhəd hadisəsi/münaqişəsi müharibə deməkdir;* **2.** nəzərdə tutmaq; məqsəd güdmək; demək istəmək; *What do you mean by saying that? Sən/Siz bu sözlərlə nə demək istəyirsən?/istəyirsiniz?; I didn't mean you to read the letter Mən sənin/sizin məktubu oxumağını/oxumağınızı nəzərdə tutmamışdım;* **to ~ business** boş danışıqdan işə keçmək; **to ~ mischief** bəd niyyət güdmək; **to ~ for** niyyətində olmaq; *He means you no harm O sizə heç bir pislik etmək niyyətində deyil; I meant this for my son Mən bunu oğluma vermək niyyətində idim; He seems obviously meant for the army O açıq-aşkar əsgər getmək niyyətindədir;* **to ~ smth. to smb.** bir kəs üçün əhəmiyyətli olmaq; *Your friendship means a great deal to me Sənin/Sizin dostluğun/dostluğunuz mənim üçün böyük əhəmiyyət kəsb edir;* **to ~ well** xoş niyyət güdmək; *Of course he means well Şübhəsiz, o, xoş niyyət güdür*
**meander** [mı'ændəʳ] *v* **1.** burulmaq; burula-burula axmaq *(çay və s. haq.)*; **2.** avaralanmaq; vaxtını boş-boşuna keçirmək
**meaning¹** ['mi:nıŋ] *n* məna
**meaning²** ['mi:nıŋ] *adj* məna daşıyan
**meaningful** ['mi:nıŋfəl] *adj* mənalı, mənası olan, məna kəsb edən
**meaningless** ['mi:nıŋlıs] *adj* mənasız; mənası olmayan
**meanness** ['mi:nnıs] *n* **1.** əclaflıq, rəzillik, alçaqlıq, bədxahlıq, bədniyyətlik; **2.** *riyaz.* orta hədd
**means** ['mi:nz] *n* I vasitə, üsul, yol; *All possible means have been tried Bütün mümkün (olan) vasitələrdən istifadə edilmişdir;* **by ~ of...** vasitəsi ilə...; *Thoughts are expressed by means of words Fikirlər sözlər vasitəsi ilə ifadə edilir;* **by no ~** heç vəchlə; qətiyyən; *These goods are by no means satisfactory Bu mallar qətiyyən qənaətbəxş deyildir;* **by some ~ or other** bu və ya digər yolla; hansı yolla olursa olsun, hər necə olsa; **by no manner of ~** heç cür; **by fair ~ or foul** nəyin bahasına olursa olsun; **ways and ~** metodlar və üsullar
**means** ['mi:nz] *n* II pul; vəsait; **a man of ~** dövlətli/varlı adam, var-dövlət sahibi olan adam; **to have private ~** var-dövlətli olmaq; *Has he any private means? O, varlı-dövlətlidirmi?*
**meant** [ment] **to mean** *felinin pt, pp formaları*
**meantime** ['mi:ntaım] *adv* bir arada/dəmdə; halbuki, bununla belə/ bərabər
**meanwhile** ['mi:nwaıl] *adv* = **meantime**
**measles** ['mi:zlz] *n tib.* qızılca *(yoluxucu xəstəlik)*
**measly** ['mi:zlı] *adj* **1.** qızılcalı, qızılca xəstəliyinə tutulmuş; **2.** *jarq.* kiçik; xırda; əhəmiyyətsiz; ucuz, azqiymətli olan; **a ~ present** ucuz hədiyyə; **to give a ~ present** ucuz/xırda hədiyyə vermək
**measurable** ['meʒərəbl] *adj* ölçüyə gələn; ölçülə bilən
**measurably** ['meʒərəblı] *adv* ölçüyə gələn dərəcədə

**measure**[1] ['meʒəʳ] *n* **1.** meyar, ölçü *(həm də məc.)*; **cubic/square/ metric ~** kub/kvadrat/ metr ölçüsü; **liquid ~** maye ölçüsü; **made to ~** ölçüyə müvafiq şəkildə qayrılmış/tikilmiş; **to have a coat made to ~** ölçüyə uyğun olan palto tikdirmək; *He poured me out a generous measure of gin O mənə bolluca cin süzdü; Popularity is no measure of greatness Məşhurluq böyüklük ölçüsü deyildir*; **2.** dərəcə; **in some ~** müəyyən dərəcədə; *The position has improved beyond measure Vəziyyət ölçüyəgəlməz dərəcədə yaxşılaşıb; He has a certain measure of independence O müəyyən dərəcədə müstəqildir; There is a measure of truth in that Bu işdə müəyyən dərəcədə həqiqət vardır*; **3.** tədbir, ölçü; **to take ~s** ölçü götürmək; **to take strong/preventive ~s** qəti/profilaktik ölçü götürmək

**measure**[2] ['meʒəʳ] *v* **1.** ölçmək; ölçü götürmək; **to ~ distance** məsafəni ölçmək; **to ~ depth/ length/temperature** dərinliyi/uzunluğu/ hərarəti ölçmək; **to ~ *smb.'s* height** bir kəsin boyunu ölçmək; **2.** *məc.* ölçüb-biçmək; bişirib çıxarmaq *(sözü); He measures his words O, sözləri ağzında bişirib çıxarır*; **3.** ölçüsündə olmaq; *This room measures 6 metres by 12 Bu otağın ölçüsü 6-nın 12 metrə nisbətindədir; What does the garage measure? Bu qarajın ölçüsü neçədir?; The rug measures 2 square metres Bu gəbənin ölçüsü 2 kvadrat metrdir*; **4.** **(~ up)** *məc.* doğrultmaq *(ümidi); The car didn't measure up to our expectations Bu maşın bizim ümidimizi doğrultmadı; He doesn't measure up to the job O bu işdə özünü doğrultmur*

**measured** ['meʒəd] *adj* ölçülü, ölçüsündə olan; səlis, ritmli; **at a ~ pace** ölçülü addımla; **in ~ tones** təmkinli tonla; **a ~ reply** səlis/ölçülüb-biçilmiş cavab

**measureless** ['meʒələs] *adj* ölçüsüz, ölçüsü olmayan

**measurement** ['meʒəmənt] *n* ölçü; **system of ~** ölçü sistemi

**measuring**[1] ['meʒərɪŋ] *n* ölçü

**measuring**[2] ['meʒərɪŋ] *adj* ölçü bildirən; **~ glass** menzurka

**meat**[1] [mi:t] *n* **1.** ət *(ərzaq kimi istifadə olunan heyvan və quş əti)*; **cold ~** soyutma ət; **chilled /frozen ~** donmuş ət; **2.** bir şeyin canı/ mahiyyəti; *There is not much meat in this argument Bu mübahisənin elə bir əsası/ mahiyyəti/kökü yoxdur*; **3.** *arx.* yemək;

◊ **green ~** göyərti, tərəvəz; **~ and drink** yemək-içmək; **to be ~ and drink to smb.** bir kəsə zövq/ləzzət vermək; *One man's meat is another man's poison* ≅ *Özgə payına göz dikən xeyir tapmaz*

**meat**[2] [mi:t] *adj* ət, ətli, ətdən hazırlanmış; **~ scrap** ət sənayesi tullantıları; **~ extract** ət ekstraktı/şirəsi; **~ cutting plant** ət kombinatı; **~ diet** ətli qida; **~ pie** ətdən hazırlanmış piroq /kökə

**meatball** ['mi:tbɔ:l] *n* küftə

**meat-eating** ['mi:t,i:tɪŋ] *adj* ətyeyən; **~ animals** ətyeyən heyvanlar

**meatless** ['mi:tlɪs] *adj* ətsiz; **~ soup** ətsiz şorba/ sup

**meaty** ['mi:tɪ] *adj* ətli, ətli-canlı, kök

**mech** [mek] *n* **mechanical** *və ya* **mechanics** *sözlərinin qısaldılmış forması*

**mechanic** [mɪ'kænɪk] *n* mexanik

**mechanical** [mɪ'kænɪkl] *adj* **1.** mexaniki; **2.** qeyri-iradi, avtomatik; **~ movements** qeyri-iradi /avtomatik hərəkətlər

**mechanically** [mɪ'kænɪkəlɪ] *adv* mexaniki/ qeyri-iradi olaraq; mexaniki şəkildə

**mechanics** [mɪ'kænɪks] *n* mexanika *(mexanika haqqında təlim); Mechanics is an exact science Mexanika dəqiq elmdir*

**mechanism** ['mekənɪzm] *n* mexanizm *(bütöv bir qurğunun və ya təşkilatın işlək bir hissəsi)*; **the ~ of the government** hökumətin işlək mexanizmi

**mechanistic** [,mekə'nɪstɪk] *adj* mexanika, mexanikaya aid olan; **the ~ theory** mexanika nəzəriyyəsi

**mechanization, -isation** [,mekənaɪ'zeɪʃn] *n* mexanikləşdirmə

**mechanize, -ise** ['mekənaɪz] *v* mexanikləşdirmək, mexanika ilə təchiz etmək; **to ~ force** ordunu mexanika ilə təchiz etmək, ordunu mexanikləşdirmək

**medal** ['medl] *n* medal

**medallion** ['medælɪən] *v* medalyon

**medallist,** *amer.* **medalist** ['medəlɪst] *n* medalist, medalçı *(medalla təltif olunmuş adam)*

**meddle** ['medl] *v* **1.** **(in, with)** qarışmaq, müdaxilə etmək; burnunu soxmaq; *Don't meddle in my affairs! Mənim işlərimə qarışma/ qarışmayın!* **2.** toxunmaq, dəymək, əl vurmaq; *Children, don't meddle with these books! Uşaqlar, bu kitablara əl vurmayın!*

**meddler** ['medləʳ] *n* hər işə qarışan/burnunu soxan adam

**meddlesome** ['medlsəm] *adj* zəhlətökən, əlçəkməyən; burnunu hər işə soxan

**media** ['mi:dɪə] *n* **1.** mətbuat; **the mass ~** kütləvi/mətbuat informasiya vasitələri; **2.** orta; orta hədd

**mediaeval** ['medɪ:vəl] *adj* = **medieval**

**medial** ['mi:dɪəl] *adj* orta, ortada yerləşmiş; orta hədli

**medially** ['mi:dɪəlɪ] *adv* düz ortada

**median** ['mi:dɪən] *adj* ortada yerləşən; ortadaan keçən

**mediate** ['mi:dɪeɪt] *v* **(in, between)** vasitəçilik /araçılıq etmək; **to ~ between two warring countries** müharibə edən iki ölkə arasında vasitəçilik etmək



**mediation** [,mi:dɪ'eɪʃn] *n* ara düzəltmə; vasitəçilik etmə; *All offers of mediation by a third party were rejected Üçüncü tərəfin bütün vasitəçilik təklifləri rədd edildi*

**mediator** [,medɪ'eɪtəʳ] *n* vasitəçi; araçı, aradüzəldən

**medicaid** ['medɪkæd] *n* ictimai, pulsuz tibbi yardım

**medic** ['medɪk] *n* **1.** həkim; ali tibb məktəbi tələbəsi; **2.** tibbi yardım göstərən döyüşçü

**medical** ['medɪkl] *adj* **1.** tibb, tibbi; **a ~ examination** tibbi müayinə; **a ~ practitioner** ixtisaslı həkim; **a ~ school** tibb məktəbi; **~ students** tibb universitetinin tələbələri; **~ knowledge** tibbi bilik; **2.** cərrahiyyəyə məruz qalmayan; müalicə edilən; **~ not surgical treatment** cərrahiyyə etməklə deyil, dava-dərmanla müalicə; *The hospital has a medical ward and a surgical ward Xəstəxananın müalicə və cərrahiyyə şöbəsi vardır*

**medically** ['medɪkəlɪ] *adv* tibbi baxımdan/nöqteyi-nəzərdən

**medicament** ['medɪkəmənt] *n* medikament; dərman, dava-dərman

**medicare** ['medɪkeəʳ] *n* qocalar üçün tibbi yardım proqramı

**medicate** ['medɪkeɪt] *v* tibbi müalicə etmək

**medicated** ['medɪkeɪtɪd] *adj* tibbi, təbabətə aid olan; **~ soup** tibbi sabun

**medication** [,medɪ'keɪʃn] *n* müalicə; müalicə üçün dava-dərman; **mass ~** kütləvi tibbi yardım *(müalicə)*

**medicinal** [mɪ'dɪsɪnl] *adj* müalicə *(dərman preparatları haq.)*; **~ springs/herbs** müalicə bulaqları/otları

**medicine** ['medsn] *n* **1.** dərman; müalicə üçün istifadə edilən maddə; *He always takes medicine O həmişə dərman qəbul edir; This is a good medicine for cough Bu öskürək üçün yaxşı dərmandır*; **2.** təbabət *(elm)*; **to study ~ and surgery** təbabəti və cərrahiyyəni öyrənmək; **Doctor of ~** təbabət elmləri doktoru; **3.** *məc.* can dərmanı, çox qiymətli əşya/insan

**medico** ['medɪkou] *n (pl* **-os** [-kouz]*) d.d.* həkim və ya tələbə-həkim

**medieval, mediaeval** ['medɪ:vl] *adj* orta əsrlərə aid olan; **~ history** orta əsrlər tarixi

**mediocre** [,mi:dɪ'oukəʳ] *adj* adi, orta, gözəçarpmayan; **~ people** adi/ gözəçarpmayan adamlar

**mediocrity** [,mi:dɪ'ɔkrətɪ] *n (pl* **-ties)** adilik, ortabablıq, aralıq, keçid; **a Government of mediocrities** keçid/aralıq hökuməti

**meditate** ['medɪteɪt] *v* **1.** ölçüb biçmək; götür-qoy etmək; düşünmək; **2.** fikrə qərq olmaq; *He sat there meditating upon his misfortunes O oturub öz bədbəxtliyi barədə fikirlərə qərq olmuşdu*

**meditation** [,medɪ'teɪʃn] *n* ölçüb biçmə, fikirləşmə; **deep in ~** dərin fikir içində

**meditative** ['medɪtətɪv] *adj* xəyalpərəst, xülyaçı, fantaziyaçı

**meditatively** ['medɪtətɪvlɪ] *adv* ölçüb biçərək; düşünərək; düşünüb-daşınaraq; götür-qoy edərək, düşünə-düşünə

**Mediterranean** [,medɪtə'reɪnɪən] *adj* Aralıq; **~ sea** Aralıq dənizi

**medium**[1] ['mi:dɪəm] *n* **1.** vasitə; ifadə vasitəsi; mətbuat; *Commercial television is a medium for advertising Kommersiya televiziyası reklam vermək üçün vasitədir; Vacant positions can be made known through the medium of press Boş vəzifələr mətbuat vasitəsilə xəbər verilə bilər; Oil paints and water colours are mediums for the creation of works of art Yağlı və sulu boyalar incəsənət əsərlərinin yaradılması üçün vasitədir*; **2.** orta keyfiyyət/dərəcə; **3.** ötürücü; yayıcı; parlayıcı; *Air is the medium of sound Hava səsi ötürür/yayır*; **4.** ruhlarla əlaqə yaradan insan; ruhla canlı insan arasında ötürücü

**medium**[2] ['mi:dɪəm] *adj* orta; **a man of ~ height** orta boylu adam; **a ~-sized firm** orta səviyyəli firma; **the ~ income groups** orta gəlirli əməkçilər; **~ wave** *radio* orta dalğa

**medley** ['medlɪ] *n* qarışıq; hibrid, metis

**medliar** ['medləʳ] *n* **1.** muşmula *(meyvə)*; **2.** *bot.* muşmula *(ağac)*

**medusa** [mɪ'dju:zə] *n zool.* meduza *(bədəni həlməşik maddədən ibarət ox ayaqcıqlı dəniz heyvanı)*

**meed** [mi:d] *n* mükafat; layiqli tərif

**meek** [mi:k] *adj* dinc, sakit, lal-dinməz, hər şeyə qane olan; üzüyola; *She is as meek as a lamb O, quzu kimi dincdir/sakitdir*

**meekly** ['mi:klɪ] *adv* quzu kimi; lal-dinməz, dinc, sakit

**meekness** ['mi:knɪs] *n* lal-dinməzlik; sakitlik, dinclik; üzüyolalıq

**meet** [mi:t] *v (pt, pp* **met** [met]*)* **1.** üz-üzə gəlmək; rastlaşmaq; görüşmək; **to ~ *smb.* in the street** bir kəslə küçədə rastlaşmaq; *We met each other quite by chance Biz bir-birimizlə tamamilə təsadüfən rastlaşdıq*; **2.** tanış olmaq; *Meet my friend! Dostumla tanış ol!/olun!; Pleased to meet you Səninlə/ Sizinlə tanış olmağa şadam*; **3.** qarşılamaq; *Will you meet me at the station? Sən/Siz məni vağzalda qarşılayacaqsanmı/ qarşılayacaqsınızmı?; The hotel bus meets all the train Mehmanxananın avtobusu bütün qatarların qarşısına çıxır*; **4.** təmin etmək, cavab vermək; uyğun olmaq, yerinə yetirmək; *I'll meet your demand Mən sənin/ sizin tələbini/tələbinizi təmin edəcəyəm*; **to ~ *smb.'s* wishes** bir kəsin arzusunu yerinə yetirmək; **to ~ the case** tələbata uyğun olmaq; *Your proposal hardly meets the case Sənin/Sizin təklifin/təklifiniz məqsədə uyğun deyil*; **5.** ödəmək; **to ~ all expences** bütün xərcləri ödəmək;

◊ **to make both ends ~** günü günə calamaqla ayı başa vurmaq/çətinliklə dolanmaq; **to ~**

*smb.'s* **eye** bir kəsin gözünə dəymək/sataşmaq; *She was afraid to meet my eye O mənim gözümə dəyməkdən qorxurdu*

**meeting** ['mi:tɪŋ] *n* 1. mitinq; yığıncaq; **political ~s** siyasi yığıncaqlar/mitinqlər; *Mr Smith will now address the meeting İndi cənab Smit mitinqdə çıxış edəcək;* 2. yığışma; *The meeting between the two families was a joyful one İki ailənin bir yerə yığışması çox şən bir hadisə idi*

**megahertz** ['megəhə:ts] *n* meqaherts

**megalomania** [ˌmegələ'meɪnɪə] *n* allahlıq iddiası, mübtəlalıq, düşkünlük; *The dictator was suffering from megalomania Diktator meqalomaniya (şöhrət düşkünlüyü) xəstəliyinə tutulmuşdu*

**megalomaniac** [ˌmegələ'meɪnɪək] *n* meqalomaniya xəstəliyinə tutulmuş; şöhrət düşkünü/dəlisi

**megaphone** ['megəfoun] *n* meqafon; səsi uzaqlara yayan cihaz/aparat

**megaton** ['megətʌn] *n* meqaton *(partlama gücü bir milyon tona bərabər olan trotil)*

**megavolt** ['megəvoult] *n el.* meqavolt

**megawatt** ['megəwɔt] *n el.* meqavatt *(bir milyon vat)*

**megrim** ['mi:grɪm] *n* 1. *tib.* miqren; parabaş *(adətən başın bir yarısında əmələ gələn ağrı)*; 2. *pl* ruh düşkünlüyü

**melancholic** [melæŋ'kɔlɪk] *adj* melanxolik *(temperament növü)*

**melancholia** [ˌmelən'koulɪə] *n* melanxoliya *(ruh düşkünlüyü ilə müşayiət olunan ruhi xəstəlik)*

**melancholy** ['meləŋkəlɪ, -kɔlɪ] *n* qəmginlik; ruh düşkünlüyü

**melange** ['meɪla:nʒ] *n* mikstura, qarışıq dərman

**meliorate** ['mi:lɪəreɪt] *v* 1. yaxşılaşdırmaq; 2. yaxşılaşmaq

**melioration** [ˌmi:lɪə'reɪʃn] *n* 1. yaxşılaşdırma prosesi; 2. *k.t.* meliorasiya *(qurutma, suvarma və s. yolu ilə torpaqların münbitliyini yaxşılaşdırma)*

**mellifluous** [me'lɪfluəs] *adj* şirin, məlahətli, axıcı, rəvan *(səs, söz, musiqi haq.)*

**mellow** ['melou] *adj* 1. dadlı, şirin; yetişmiş, köhnə; **a ~ wine** şirin şərab/çaxır; 2. xoş, yumşaq *(rəng haq.)*; **the ~ colours of the roofs in Shusha** Şuşadakı evlərin damlarının rənginin göz oxşaması

**mellowness** ['melounɪs] *n* 1. şirinlik; 2. təravət, incəlik, yumşaqlıq, zəriflik

**melodic** ['mɪlɔdɪk] *adj* melodik, melodiyalı

**melodious** [mɪ'loudɪəs] *adj* = **melodic**

**melodrama** [ˌmelə'dra:mə] *n* melodrama *(həyəcanlandırıcı və emosional dram əsəri)*

**melodramatic** [ˌmelədrə'mætɪk] *adj* melodramatik; şən sonluqlarla qurtaran; **a ~ play** melodramatik pyes

**melody** ['melədɪ] *n* 1. melodiya; hava; 2. mahnı, nəğmə; **old Irish melodies** qədim irland melodiyaları/mahnıları; **old folk ~** qədim xalq nəğmələri/havaları

**melon** ['melən] *n* yemiş; **a slice of ~** bir dilim yemiş

**melt** [melt] *v* 1. əritmək; *The hot sun soon melted the ice İsti günəş tezliklə buzu əritdi; It is easy to melt butter Yağı əritmək asandır;* **to ~ away** getdikcə azalma, yox olub getmək, yoxa çıxmaq; *The snow soon melted away when the sun came out Günəş çıxanda qar tezliklə əriyib yoxa çıxdı;* 2. *məc.* qurtarmaq; yoxa çıxmaq; *Her money seemed to melt away in Paris Onun pulu Parisdə elə bil ki/sanki sovruldu/yoxa çıxdı; The crowd quickly melted away as soon as the storm broke Fırtına başlayan kimi izdiham dağıldı/yoxa çıxdı;* **to ~ smth. down** bir şeyi əritmək; 3. ərimək; *This cake melts in the mouth Bu pirojna ağızda əriyir; Sugar melts in hot tea Qənd isti çayda əriyir;* 4. yumşalmaq *(insan, hisslər, ürək haq.); Her heart melted with pity Onun ürəyi rəhmdən yumşaldı; Pity melted her heart Rəhm hissi onun ürəyini yumşaltdı;* 5. qarışmaq; *One colour melted into another Bir rəng başqa rəngə qarışdı*

**melting** ['meltɪŋ] *adj* 1. əriyən; ərimə; **~ point** ərimə nöqtəsi/dərəcəsi; *Lead has a lower melting point than iron Qurğuşunun ərimə nöqtəsi dəmirin ərimə nöqtəsindən aşağıdır;* 2. həssas; yumşaq, zərif; **in a ~ voice** zərif səslə; **a ~ pot** metal əridən qazan;
◊ **to go into the ~ pot** köklü dəyişikliyə uğramaq

**member** ['membə'] *n* 1. üzv *(müəyyən bir cəmiyyətin, ailənin, təşkilatın və s.);* **a ~ of a club** klubun üzvü; **a ~ of a family** ailənin üzvü; *Every member of the girl's family came to her wedding Qız ailəsinin hər bir üzvü onun toyuna gəldi;* **~ of Parliament** Parlament üzvü *(qısa forması: MP)*; 2. üzv *(bədəndə)*

**membership**[1] ['membəʃɪp] *n* 1. üzvlük; 2. üzvlərin sayı/miqdarı; **a large ~** üzvlərin çoxluğu; **an increase in the ~ of the committee** komitənin üzvlərinin miqdarının artması; **a society with a ~ of a thousand** min nəfər üzvdən ibarət olan cəmiyyət

**membership**[2] ['membəʃɪp] *adj* üzvlük; **~ fee** üzvlük haqqı; **~ card** üzvlük bileti

**membrane** ['membreɪn] *n* membran *(nazik pərdə; toxuma)*

**membranous** ['membrənəs] *adj* membranabənzər, membranaoxşar, membranlı

**memento** [mə'mentou] *n* 1. xatırlama əşyası, yadigar; 2. hədiyyə

**memento mori** [mə'mentou'mɔ:rɪ] *n lat.* ölümü xatırlama/yaddan çıxarmama

**memo** ['memou] *n* **memorandum** *isminin qısa forması*

**memoir** ['memwa:'] *n* 1. memuar *(xatirat)*; 2. öz həyatı haqqında şəxsin yazdığı qeydlər

**memorable** ['memərəbl] *adj* unudulmaz, yaddan çıxmayan; **a ~ meeting** unudulmaz görüş



**memorandum** [ˌmemə'rændm] *n* 1. *(pl* **-da, -s** [-z]) memorandum; 2. *hüq.* niyyət protokolu, memorandum

**memorial**[1] [mɪ'mɔ:rɪəl] *n* 1. memorial, abidə, heykəl; **a war ~** müharibə qurbanlarına memorial; **as ~ of smth.** bir şeyin xatirəsi olaraq; 2. *pl* salnamə

**memorial**[2] [mɪ'mɔ:rɪəl] *adj* xatirə, yada salan, yadda qalan, xatırladıcı; **a ~ tablet** xatirə lövhəsi

**Memorial Day** [mɪ'mɔ:rɪəldeɪ] *n amer.* ABŞ-da müharibələrdə ölənlərin xatirə günü *(30 may)*

**memorize, -ise** ['meməraɪz] *v* 1. əzbər öyrənmək; əzbərləmək; 2. əbədiləşdirmək

**memory** ['memərɪ] *n* 1. yaddaş; **a good/a bad ~** yaxşı/pis yaddaş; **a short ~** huşsuz, unutqanlıq, yaddaşsızlıq; **to commit smth. to ~** bir şeyi əzbər öyrənmək; **to speak from ~** əzbərdən danışmaq; **in ~ of smb.** bir kəsin xatirəsinə; 2. yaddaş *(kompyuterdə)*; yaddaş *(insan beynində); Some people have better memories than others Bəzi adamların yaddaşı başqalarınkından yaxşıdır; He has a bad memory for dates O, tarixi yadda pis saxlayır;* **within living ~** sağ qalan insanların yaddaşında; 3. xatirə; **memories of childhood** uşaqlıq xatirələri; 4. ölümündən sonra qalan xatirə *(məşhur adamların)*; **in ~ of…** …xatirəsinə; **in ~ of poets** şairlərin xatirəsinə

**men** [men] *n* **man** [mæn] *isminin cəm forması*

**menace**[1] ['menəs] *n* hədə, təhlükə; qorxu; vahimə; **a ~ to world peace** dünya sülhünə təhlükə; **a speech filled with ~** hədə dolu nitq

**menace**[2] ['menəs] *v* hədələmək, təhdid etmək, qorxutmaq; *Her life was menaced Onun həyatı təhlükə altında idi*

**menacingly** ['menəsɪŋlɪ] *adv* hədələyici şəkildə, hədə-qorxu gələrək, təhdidedici/ qorxuducu tərzdə

**menage** [me'na:ʒ] *n* ailə; məişət; təsərrüfat

**menagerie** [mɪ'nædʒərɪ] *n* qəfəs/barmaqlıq içərisinə salınmış heyvan

**mend** [mend] *v* 1. düzəltmək; yamamaq; təmir etmək *(sınmış, cırılmış, köhnəlmiş şeyləri)*; **to ~ shoes** ayaqqabıları təmir etmək/ yamamaq; **to ~ a broken window** sınmış pəncərəni təmir etmək; 2. işləri qaydasına salmaq; *That won't mend matters Bu, işləri qaydaya sala/düzəldə bilməz;* 3. səhhətini bərpa etmək; sağlamlığına fikir vermək; *The patient is mending nicely Xəstə çox yaxşı sağalır;* 4. tezləşdirmək, sürətləndirmək; **to ~ one's pace** addımlarını tezləşdirmək/ sürətləndirmək; **to ~ the fire** ocağı qızışdırmaq;
◊ *It's never too late to mend at. söz İşləri qaydasına salmaq heç vaxt gec deyildir ≅ Yalamazsan doymazsan, yamamazsan geymazsən*

**mendacious** [men'deɪʃəs] *adj* saxta; yalançı; **~ newspaper reports** saxta qəzet məlumatları

**mendaciously** [men'deɪʃəslɪ] *adv* yalancasına, saxtakarcasına

**mendacity** [men'dæsɪtɪ] *n* saxtakarlıq, yalançılıq

**mender** ['mendə'] *n* təmir edən *(adam)*, quraşdıran *(adam)*, yamaqçı; **road ~** yol təmirçisi /təmir edən *(fəhlə)*

**menfolk** ['menfouk] *n pl d.d.* kişilər

**menial** ['mi:nɪəl] *adj* xidmətçiyə/qulluqçuya aid; maraqsız; **~ job** maraqsız iş; *He never helps me with the menial tasks O heç vaxt mənə ev işlərində kömək etmir*

**meningitis** [ˌmenɪn'dʒaɪtɪs] *n tib.* meningit

**menopause** ['menəpɔ:z] *n* qadınlarda aybaşının /menstruasiyanın kəsilməsi *(yaşla əlaqədar olaraq)*

**menses** ['mensi:z] *n* aybaşı, menstruasiya

**menstrual** ['menstruəl] *adj* aybaşı, aybaşı ilə əlaqədar olan; **~ period** aybaşı dövrü/ müddəti

**menstruate** ['menstrueɪt] *v* aybaşı olmaq

**menstruation** [ˌmenstru'eɪʃn] *n fiziol.* menstruasiya, aybaşı

**mensurable** ['mensjurəbl] *adj* ölçülən, ölçüyə gələn, ölçülə bilən

**mental** ['mentl] *adj* əqli; ağılla bağlı; ağıla aid olan; ruhi; **~ abilities** əqli qabiliyyətlər; **~ age** əqli inkişaf; **~ home/hospital** dəlixana; **~ illness** ruhi xəstəlik, dəlilik; **~ patient** ruhi xəstə, dəli

**mentality** [men'tælɪtɪ] *n* ağıl, zəka, idrak, zehin; düşüncə, zehnin inkişaf səviyyəsi; **a person of average ~** əqilcə orta səviyyəli adam

**menthol** ['menθɔl] *n kim.* mentol *(dərman)*

**mention** ['menʃn] *v* 1. bildirmək, danışmaq; adını çəkmək; qeyd etmək; **to ~ smb. in a will** bir kəsin adını vəsiyyətnamədə qeyd etmək; *He mentioned to me that he had seen you O mənə bildirdi ki, o səni/sizi görüb;* 2. xatırlatmaq, yadına salmaq; *I'll mention it to her Mən bunu onun yadına salacağam/ona xatırladacağam;*
◊ *Don't mention it! Dəymaz! (təşəkkürə cavab olaraq)*

**mentioned** ['menʃnd] *adj* adı çəkilmiş; qeyd edilmiş, xatırladılmış; **above ~** yuxarıda xatırladılmış/adı çəkilmiş; **below ~** aşağıda xatırladılmış/adı çəkilmiş

**mentor** ['mentɔ:'] *n* müşavir, məsləhətçi, məsləhət verən, başa ağıl qoyan adam

**menu** ['menju:] *n* menyu *(restoran və yeməkxanalarda xörəklərin adı və qiyməti yazılan siyahı)*

**mercantile** ['mə:kəntaɪl] *adj* sövdə; ticarət; **~ marine** ticarət donanması/flotu

**mercenary** ['mə:sɪnərɪ] *adj* möhtəkir, mənfəətgüdən, dəllal; pul hərisi; **~ politicians** möhtəkir/dəllal siyasətçilər; **act from ~ motives** möhtəkirlik məqsədilə edilən hərəkət

**mercer** ['mə:sə'] *n* ipək və məxmər alverçisi

**mercerize, -ise** ['mə:səraɪz] *v toxuc.* ipliyi rəngləyib/parlaqlaşdırıb ipəyəbənzər şəklə salmaq

**merchandise**[1] ['mə:tʃəndaɪz] *n* alğı-satqı malları; mal, əmtəə

**merchandise²** [ˈmə:tʃəndaɪz] *v* alver etmək
**merchant¹** [ˈmə:tʃənt] *n* 1. tacir *(topdansatış ticarəti ilə məşğul olan)*; **a coal ~** kömürsatan tacir; 2. *amer.* dükançı
**merchant²** [ˈmə:tʃənt] *adj* ticarət; **a ~ navy** ticarət donanması; **a ~ bank** ticarət bankı
**merciful** [ˈmə:sɪfl] *adj* rəhmli, mərhəmətli, ürəyiyumşaq, rəhmdil, şəfqətli; **to be ~ to smb.** bir kəsə rəhm etmək/yazığı gəlmək/şəfqət göstərmək
**merciless** [ˈmə:sɪlɪs] *adj* zalım; qəddar, amansız, zülmkar, rəhmsiz
**mercurial** [mə:ˈkjuərɪəl] *adj* 1. civə; **~ ointment** civə məzı *(dərman)*; **~ poisoning** civə zəhərlənməsi; 2. canlı; cəld; zirək; qıvraq; diri, diribaş
**mercury** [ˈmə:kjurɪ] *n* I civə
**Mercury** [ˈmə:kjurɪ] *n* II 1. Roma mifologiyasında allahın elçisi; 2. Merkuri *(günəşə ən yaxın olan planet)*
**mercy** [ˈmə:sɪ] *n* 1. rəhm; mərhəmət; aman; insaf; *They showed no mercy to their enemies Onlar (öz) düşmənlərinə aman vermədilər; We were given no mercy Bizə heç bir aman verilmədi; He threw himself on my mercy O mənim ayaqlarımın altına yıxılaraq aman dilədi; The jury brought in a verdict of guilty, with a recommendation to mercy Hakimlər onun günahkar olması barədə qərar çıxardılar və ona rəhm edilməsini xahiş etdilər*; **at the ~ of smb.** bir kəsin amanında/insafında; *The ship was at the mercy of waves Gəmi dalğaların insafına qalmışdı*; 2. bəxtin gətirməsi; şükranlıq; *We must be thankful for small mercies Biz allahın bəxş etdiyi ən cüzi rəhmə şükür etməliyik; His death was a mercy Ölüm onun canını qurtardı*
**mere¹** [mɪəʳ] *n* gölməçə, göl
**mere²** [mɪəʳ] *adj* az; kiçik, sadə, sadəcə; *She is a mere child O sadəcə bir uşaqdır; It's a mere trifle Boş şeydir*
**merely** [ˈmɪəlɪ] *adv* yalnız; sadəcə olaraq; *I merely asked his name Mən sadəcə olaraq onun adını soruşdum; I said it merely as a joke Mən onu sadəcə olaraq zarafatyana dedim*
**meretricious** [ˌmerɪˈtrɪʃəs] *adj* gözqamaşdıran, saxta, süni; **~ jewelry** saxta/süni daş-qaş
**merge** [mə:dʒ] *v* 1. birləşdirmək; təmərküzləşmək, birləşmək; *We are merging with the company that supplies components for our cars Biz maşınlarımız üçün hissələr hazırlayan şirkətlə birləşirik; The small banks merged Kiçik banklar təmərküzləşdi/ birləşdi*; 2.: **to ~ into** çevrilmək, əvəz edilmək, qovuşmaq; *Twilight merged into darkness Alaqaranlıq qaranlığa qovuşdu; His fear gradually merged into curiosity to know what was happening Nəyin baş verdiyini bilmək istədikdə, onun qorxusu yavaş-yavaş marağa çevrildi*
**merger** [ˈmə:dʒəʳ] *n* 1. birlik, ittifaq *(bankların, müəssisələrin)*; 2. qovşaq, su qovşağı
**meridian** [məˈrɪdɪən] *n* 1. *astr.* meridian xətti/dairəsi; 2. zirvə, yüksək nöqtə; 3. gücün/uğurun/ləzzətin ən yüksək anı
**meridional¹** [məˈrɪdɪənl] *n* cənublu *(xüs. Fransanın cənubundan olan)*
**meridional²** [məˈrɪdɪənl] *adj* meridional, cənubi
**merino** [məˈri:nou] *n* 1. merinos *(uzun yunu olan qoyun cinsi)*; 2. merinos yunundan hazırlanmış parça
**merit¹** [ˈmerɪt] *n* xidmət, ləyaqət; dəyər; şərəf; **the artistic ~s of the film** filmin bədii dəyərləri; **to judge smb. on his ~s** bir kəsi ləyaqətinə görə qiymətləndirmək; **an award for ~s** xidmətə görə mükafat; **to treat a case on its ~s** məsələnin mahiyyətinə varmaq; *His idea at least has the merit of being original Onun ideyası hər halda öz orijinallığı ilə dəyərlidir*; **men of ~** ləyaqət sahibi olan adamlar; **to treat smb. according to his ~s** bir kəsi xidmətinə/ləyaqətinə görə qiymətləndirmək
**merit²** [ˈmerɪt] *v* layiq/nail olmaq, qazanmaq
**meritocracy** [ˌmerɪˈtɔkrəsɪ] *n top.* i cəmiyyətin qaymaqları *(yüksək əməl və zəka sahibi olan insanlar)*
**meritorious** [ˌmerɪˈtɔ:rɪəs] *adj* nümunəvi, tərifəlayiq, mükafata layiq; **a prize for ~ conduct** nümunəvi davranış üçün mükafat
**meritoriously** [ˌmerɪˈtɔ:rɪəslɪ] *adv* ləyaqətlə; lazımınca, canla-başla, layiqincə
**mermaid** [ˈmə:meɪd] *n* su pərisi *(nağıllarda)*
**merman** [ˈmə:mən] *n (pl* **-men** [-men]) suadamı, suda yaşayan adam *(nağıllarda)*
**merry** [ˈmerɪ] *adj* şən; oynaq; **a ~ laugh** şən gülüş; **to wish smb. a ~ Novruz holiday** bir kəsin Novruz bayramını təbrik etmək; **to make ~** şənlənmək; **~ maker** şən, kefcil; zarafatcıl adam;
◊ **~ go round 1)** karusel; **2)** xoşagələn; gözoxşayan
**merrily** [ˈmerɪlɪ] *adv* şən halda; ruh yüksəkliyi ilə; deyə-gülə
**merriment** [ˈmerɪmənt] *n* şənlik, əyləncə, gümrahlıq; ruh yüksəkliyi
**mesalliance** [meˈzælɪəns] *n fr.* aşağı silkə məxsus adamla evlənmə
**mescal** [ˈmeskl] *n* 1. qlobusa bənzər Meksika kaktusu; 2. likör *(Meksikada istehsal olunan)*
**mescaline** [ˈmeskəlɪn] *n tib.* meskalin *(kaktus bitkisinin şirəsindən hazırlanan dərman)*
**Mesdames** [ˈmeɪda:m] *n* **madame** *sözünün cəm forması*
**Mesdemoiselles** [ˈmeɪdəmwa:ˈzel] *n* **mademoiselle** *sözünün cəm forması*
**mesh¹** [meʃ] *n* 1. ilgək; ilmə; 2. həncama, rəzə; 3. oyuq; dəlik; göz; tor; şəbəkə
**mesh²** [meʃ] *v* uyğun gəlmək; *Our ways of looking at these problems don't mesh Bizim bu problemə baxışlarımız uyğun gəlmir*
**mesmerism** [ˌmezməˈrɪzəm] *n* 1. hipnoz, hipnoz etmə; 2. hipnozçuluq
**mesmeric** [mezˈmerɪk] *adj* hipnotik; hipnozlu, hipnozedici
**mesmerist** [ˈmezmerɪst] *n* hipnozçu
**mesmerize** [ˈmezməraɪz] *v* hipnoz etmək; məftun/heyran/valeh etmək
**meson** [ˈmi:sən] *n fiz.* mezon *(elektron və proton arasında olan atom hissəcikləri)*
**mess¹** [mes] *n* I 1. qarmaqarışıqlıq; səliqəsizlik; nizamsızlıq; *My desk is in a mess Mənim stolum səliqəsizdir; Tidy up the mess in your room Otağını/Otağınızı səliqəyə sal/salın*; 2. çirkab; çirk; palçıq; toz-torpaq; *What a mess you are in, go and wash Lap toz-torpağın içindəsən/içindəsiniz, get yuyun/gedin yuyunun; The cat has made a mess on the carpet Pişik xalçanın üstünə batırıb*; 3. çətinlik; bəla; *He has got himself into a mess O özünü bəlaya salıb; He has made a mess of things O, aləmi bir-birinə qarışdırıb/qatıb*; **to get oneself out of a ~** özünü çətin vəziyyətdən çıxarmaq; **to get oneself into a ~** özünü çətin vəziyyətə salmaq; *He has made a mess of his life O öz həyatını çox ağır vəziyyətə salıb*
**mess** [mes] *n* II *ümumi stol arxasında yemək yeyən insan qrupu (orduda və s.)*
**mess²** [mes] *v* I 1. qarışdırmaq; qarışıq salmaq, alt-üst etmək; pozmaq; qarışmaq; *My papers are all messed up Mənim kağızlarım hamısı bir-birinə qarışıb; The weather messed up all our plans Hava bizim bütün planlarımızı alt-üst etdi/pozdu*; 2. üst-başını toz-torpaq etmək; üstünü çirkləndirmək/batırmaq; başını qatmaq, izdivaca girmək, sevişmək; *He loves messing in the garden O, bağda eşələnməyi/ əlləşməyi xoşlayır; He spent the whole day messing about with the car O bütün günü maşınla əlləşdi; He is messing with some girl in the office O, iş yerində bir qıza bənd olub/bir qızla eşqbazlıq edir*
**mess** [mes] *v* II birgə yemək, durub-oturmaq, bir yerdə olmaq; *The officers mess together Zabitlər birgə yemək yeyirlər; The five young men mess together Bu beş gənc birgə durub-otururlar*
**message** [ˈmesɪdʒ] *n* 1. namə, xəbər, qeyd; *They sent a message about their marriage Onlar evlənmələri haqqında xəbər göndərdilər*; 2. şifahi xəbər, məlumat; ismarış; *Radio messages told us that the ship was sinking Radionun verdiyi xəbərlərə/ məlumatlara görə gəmi batır; Will you take this message to my brother? Bu ismarışı/ mesajı mənim qardaşıma yetirə bilərsənmi/ bilərsinizmi?*; 3. ictimai, mənəvi və ya dini təlim; **the ~ of Muhammad** Məhəmməd peyğəmbərin dini təlimi
**messenger** [ˈmesɪndʒəʳ] *n* 1. carçı, xəbər aparan/verən/daşıyan; qasid, xəbərçi; 2. *hərb.* rabitəçi



**mess hall** [ˈmeshɔ:l] *n* yemək zalı *(bir qrup əsgərlər üçün)*
**Messiah** [mɪˈsaɪə] *n* 1. yəhudilərin xilaskarı olacaq adam; 2. İsa peyğəmbər
**messiness** [ˈmesɪnɪs] *n* səliqəsizlik; çirklilik; qarışıqlıq
**mess kit** [ˈmeskɪt] *n* əsgərin yemək dəsti *(qaşıq, boşqab, çəngəl və s.)*
**messuage** [ˈmeswɪdʒ] *n* yaşayış evi; mülk
**messy** [ˈmesɪ] *adj* çirkli; qarmaqarışıq; səliqəsiz; dağınıq
**mestizo** [ˈmestɪzou] *n* metis *(ata və anası qarışıq millətdən olan övlad)*
**met¹** [met] **to meet** *felinin pp və pt formaları*
**met²** [met] *n* **meteorological** *sözünün qısaldılmış forması*
**metabolic** [ˌmɪtəˈbɔlɪk] *adj* metabolik, maddələr mübadiləsinə aid olan; **~ disease** maddələr mübadiləsinin pozulması
**metabolism** [mɪˈtæbəlɪzəm] *n* metabolizm, maddələr mübadiləsi
**metal¹** [ˈmetl] *n* 1. metal; **imperfect ~s** paslanan/oksidləşən metallar; 2. *pl* rels; **to leave/to jump/to run off the ~s** relsdən çıxmaq *(qatar haq.)*; 3. tərkibində dəmir filizi olan süxur
**metal²** [ˈmetl] *adj* metal; **~ brush** metal şotka
**metal³** [ˈmetl] *v* metal üz çəkmək
**metallic** [mɪˈtælɪk] *adj* metal, metaldan olan; dəmir; **~ currency** dəmir pul
**metallurgical** [ˌmetəˈlə:dʒɪkl] *adj* metallurgiya, metallurgiyaya aid olan
**metallurgist** [mɪˈtælədʒɪst] *n* metallurq; metal işləri görən adam
**metallurgy** [mɪˈtælədʒɪ] *n* metallurgiya; **~ of ferrous metals** qara metallurgiya
**metamorphose** [ˌmetəˈmɔ:fouz] *v* forma etibarı ilə dəyişmək, metamorfozaya uğramaq; təbiətini dəyişmək
**metamorphosis** [ˌmetəˈmɔ:fəsɪs] *n* metamorfoza; forma dəyişkənliyi
**metaphor** [ˈmetəfəʳ] *n* metafora; bənzətmə *(məcazi mənada işlənilən söz və ya ifadə)*
**metaphorical** [ˌmetəˈfɔrɪkl] *adj* metaforik, məcazi, metaforalı
**metaphorically** [ˌmetəˈfɔrɪklɪ] *adv* metaforik/ məcazi olaraq; bənzətmə yolu ilə, məcazi mənada
**metaphysical** [ˌmetəˈfɪzɪkl] *adj* metafizik, abstrakt mühakiməedilən
**metaphysics** [ˌmetəˈfɪzɪks] *n* 1. *fəls.* metafizika; 2. uydurma, xəyali fəlsəfə; abstrakt düşüncə
**metastasize, -ise** [məˌtæstəˈsaɪz] *v* metastaz vermək; şaxələnərək yayılmaq *(xərçəng xəstəliyində)*
**metastasizing, -ising** [məˌtæstəˈsaɪzɪŋ] *adj* metastaz verən; yayılan, şaxələnən
**mete** [mi:t] *v* ölçmək, ölçüsünü/payını müəyyənləşdirmək
**meteor** [ˈmi:tɪəʳ] *n astr.* meteorit *(digər planetlər-*

*dən yer kürəsinə gələn yad cisimciklər: bunlar həm də* **shooting star** *və ya* **falling star** *adlanır)*

**meteoric** [ˌmi:tɪ'ɔrɪk] *adj* 1. meteorik *(atmosferlə və ya atmosferik vəziyyətlə bağlı)*; 2. yığcam, əla, xudmani; **a ~ career** əla peşə

**meteorite** [ˌmi:tɪə'raɪt] *n* meteorit *(yerə düşən yad cisim)*

**meteorological** [ˌmi:tɪə'rɔ:lədʒɪkl] *adj* meteoroloji; **weather forecasts from the Central Meteorological station** mərkəzi meteorologiya stansiyasının hava haqqında verdiyi məlumatlar

**meteorologist** [ˌmi:tɪə'rɔlədʒɪst] *n* meteoroloq

**meteorology** [ˌmi:tɪə'rɔlədʒɪ] *n* meteorologiya *(yer atmosferində baş verən dəyişiklikləri öyrənən elm sahəsi)*

**meter** ['mi:tə'] *n* I 1. sayğac; ölçü vahidi; **an electricity ~** elektrik sayğacı; **a gas ~** qaz sayğacı; **a water ~** su sayğacı; 2. *amer.* metr *(uzunluq ölçüsü)*

**meter** ['mi:tə'] *n* II = **metre**

**methane** ['mi:θeɪn] *n* metan *(rəngsiz və iysiz qaz: $CH_4$)*

**method** ['meθəd] *n* 1. məntiqlilik, qanunauyğunluq; ardıcıllıq, səliqəlilik; *He is a man of method O, səliqəliliyi sevən adamdır; There is method in his madness Onun dəliliyində nə isə var, O elə-belə dəli deyildir*; 2. metod; üsul; qayda; **the latest ~s** son metodlar/ üsullar; **a new ~ of processing** yeni emal metodu/üsulu; **teaching ~s** təlim/ tədris metodları

**methodical** [mɪ'θɔdɪkl] *adj* 1. metodik; **~ work** metodik iş; 2. sistemli, ardıcıl

**methodically** [mɪ'θɔdɪklɪ] *adv* metodiki baxımdan/cəhətdən

**Methodism** ['meθədɪzəm] *n* Xristianlıqda dini təlim

**Methodist** [mɪ'θɔdɪst] *n din.* metodist

**methodologist** [ˌmeθə'dɔlədʒɪst] *n* metodist

**methodology** [ˌmeθə'dɔlədʒɪ] *n* metodologiya *(metod haqqında elm)*

**methyl[1]** ['meθɪl] *n* metil *(spirt)*

**methyl[2]** ['meθɪl] *adj* metil; **~ alcohol** metil spirti

**methylated** [ˌmeθɪ'leɪtɪd] *adj* metilləşdirilmiş; **~ spirit** içməyə yararsız/texniki spirt

**meticulous** [mɪ'tɪkjuləs] *adj* çox diqqətli/ səliqəli; hər şeyə fikir verən; *He is meticulous in his dress O, geyimində çox səliqəlidir; He is noted for the meticulous accuracy of his work O öz işində həddsiz dərəcədə səliqəli olması ilə fərqlənir*

**metier** ['meɪtɪeɪ] *n* peşə, sənət, məşğuliyyət

**metre** ['mi:tə'] *n* şerdə vəzn; avaz

**metric** ['metrɪk] *adj* ölçü; **the ~ system** ölçü sistemi

**metrical** ['metrɪkl] *adj* metrik *(ölçülə bilən)*

**metrication** [ˌmetrɪ'keɪʃn] *n* metrik sistemə salma

**metricize, -ise** ['metrɪsaɪz] *v* ölçü sistemindən istifadə etmək

**Metro** ['metrou] *n* metro; **Baki ~** Bakı metrosu

**metronome** ['metrənoum] *n* 1. *mus.* takt ölçən *(cihaz)*; 2. *fiz.* metronom *(vaxtölçən cihaz)*

**metropolis** [mə'trɔpəlɪs] *n* ölkənin baş şəhəri; paytaxt; **a great ~ like Tokyo** Tokio kimi böyük paytaxt şəhər

**metropolitan** [ˌmetrə'pɔlɪtən] *adj* 1. paytaxt şəhərinə aid olan; **the ~ police** paytaxt polisi; 2. asılı olmayan, tək, özü; **M. France** Fransanın özü; 3. paytaxt sakini, paytaxt şəhərində yaşayan adam

**mettle** [metl] *n* dəyanət; dözüm *(insan və atlarda)*, əzm; **a man of ~** dözümlü insan/adam; **a horse that is full of ~** hədsiz/çox dözümlü at; **to try *smb.'s* ~** bir kəsin dözümünü yoxlamaq/sınamaq; **to be on *one's* ~** əlindən gələni etmək əzmində olmaq

**mew** [mju:] *n* pişiyin çıxardığı səs; "myo"

**mewl** [mju:l] *v* 1. daim ağlamaq, ağlayıb təngə gətirmək, sızıldamaq; 2. miyovuldamaq *(pişik)*

**mews** [mju:z] *n* at damı, tövlə

**mexican** ['meksɪkən] *adj* meksikalı

**Mexico City** ['meksɪkou sɪtɪ] *n* Mexiko şəhəri *(Meksikanın paytaxtı)*

**mezzanine** ['mezəni:n] *n* 1) *mem.* antresol; 2) belətaj

**mezzo** ['metsou] *n* yarım; yarım pərdə *(səs və musiqi haq.)*

**mezzo soprano** [ˌmetsousə'pra:nou] *n mus.* metsosoprano *(soprano və kontralto arasında olan səs)*

**mezzotint** ['metsoutɪnt] *n* metsoutint *(metal lövhədən kağız üzərinə köçürmə üsulu)*

**mi, me** [mi:] *n* musiqi oktavasında III not

**miasma** [mɪ'æzmə] *n* 1. üfunətli buğ/buxar; 2. *məc.* çirkli ətraf mühit

**mica** ['maɪkə] *n* mika *(elektrik cərəyanı keçirməyən plastik maddə)*

**mice** [maɪs] *n* **mouse** *isminin cəm forması*

**Michaelmas** ['mɪklməs] *n din.* müqəddəs Mikayıl günü – 29 sentyabr

**mickey** ['mɪkɪ] *n* əylənmə, məzələnmə; cırnatma; ◊ **to take the ~ out of *smb.*** bir kəsi elə salmaq/cırnatmaq/özündən çıxartmaq

**mickle** ['mɪkl] *n* çox, çoxluq; ◊ *Many a little makes a mickle* at. söz *Damadama göl olar*

**microbe** ['maɪkroub] *n* mikrob

**microbiology** [ˌmaɪkroubaɪ'ɔlədʒɪ] *n* mikrobiologiya

**microdot** ['maɪkrədɔt] *n* nöqtə boyda kiçildilmiş fotoşəkil

**microelectronics** [ˌmaɪkrouˈɪlektronɪks] *n* mikroelektronika

**microfilm[1]** ['maɪkroufɪlm] *n* mikrofilm *(kiçik həcmli fotoşəkilləri nümayiş etdirən film)*

**microfilm[2]** ['maɪkroufɪlm] *v* kiçik həcmli mikrofilm çəkmək

**micrometer** [ˌmaɪ'kroumɪtə'] *n* mikrometr *(ən kiçik əşyaları ölçən cihaz)*

**micron** ['maɪkrən] *n* mikron *(metrin milyonda birinə bərabər olan ölçü vahidi)*



**microorganism** [ˌmaɪkrou'ɔ:gənɪzm] *n* mikroorqanizm *(yalnız mikroskop altında görünə bilən orqanizm)*

**microphone** ['maɪkrəfoun] *n* mikrofon

**microprocessor** [ˌmaɪkrəu'prousesə'] *n* mikroprosessor *(kompyuterdə istifadə edilən inteqral daira)*

**microscope** ['maɪkrəskoup] *n* mikroskop

**microscopic** [ˌmaɪkrəs'koupɪk] *adj* mikroskopik, mikroskopa aid olan

**microscopically** ['maɪkrəskɔpɪklɪ] *adv* mikroskopik olaraq, mikroskop altında

**microwave** ['maɪkrəweɪv] *n* mikrodalğa *(çox kiçik dalğa)*

**mid[1]** [mɪd] *adj* orta; **from ~ June to ~ August** iyunun ortasından avqustun ortasına kimi/qədər; **in ~ winter** qışın ortasında/oğlan çağında

**mid[2]** [mɪd] *prep* ortasında, arasında

**mid-** [mɪd] *pref* orta *(mürəkkəb sözlərdə)*; **a mid-winter day** qışın **orta** günü, qışın oğlan çağı; **mid-morning coffee** səhərlə günorta **arasında** içilən qəhvə; the **Midwest orta** qərb

**midday** ['mɪddeɪ] *n* günorta çağı

**midden** ['mɪdn] *n* peyin, zibil yığını/topası

**middle[1]** ['mɪdl] *n* 1. ortalıq; orta; **the ~ of the room** otağın ortası; **in the ~ of the century** əsrin ortasında; **in the very ~ of the night** gecənin tən yarısında; **standing in the ~ of the street** küçənin ortasında dayanan; **a pain in the ~ of the back** kürəyin ortasında ağrı; 2. *d.d.* bel; orta; **to seize *smb.* round the ~** bir kəsin belindən/ortasından yapışmaq

**middle[2]** ['mɪdl] *adj* orta; **~ age** orta yaş; **~aged** orta yaşlı; **a ~aged woman** orta yaşlı qadın; **~ class** orta sinif; **to take/to follow a ~ course** orta mövqe tutmaq; **the ~ distance** orta məsafə; **the Middle East** Yaxın Şərq; **the ~ finger** orta barmaq; **the ~ man** aradüzəldən adam, aralıq adamı; **~ school** orta məktəb; **the ~ watch** gecə qarovulu *(gəmidə gecə saat 12-dən səhər saat 4-ə qədər olan)*; **the ~ weight** orta çəki *(66,6-dan 75 kq-a qədər)*

**middling[1]** ['mɪdlɪŋ] *adj* orta; babat; miyanə; **a town of ~ size** orta ölçülü şəhər; *He says he is feeling only middling O deyir ki, o özünü babat hiss edir*

**middling[2]** ['mɪdlɪŋ] *adv* xeyli, olduqca; **~ tall** xeyli hündür

**middy** ['mɪdɪ] *n (pl -dies) d.d.* = **midshipman**

**midge** [mɪdʒ] *n* ağcaqanad, ditdili, mığmığa, hünü

**midget** ['mɪdʒɪt] *n* liliput *(hədsiz dərəcədə balaca adam)*

**midland** ['mɪdlænd] *n* İngiltərənin orta hissəsi; **the Midlands** İngiltərənin orta hissələri

**midnight** ['mɪdnaɪt] *n* gecəyarı; **before ~** gecə yarıdan əvvəl; **after ~** gecə yarıdan sonra; ◊ **to burn the ~ oil** gecə yarıya qədər oturub işləmək

**midriff** ['mɪdrɪf] *n* 1. *anat.* diafraqma; 2. göbək nahiyəsi; **a blow on the ~** *id.* göbəyin üstünə endirilən/vurulan zərbə

**midshipman** ['mɪdʃɪpmən] *n* 1. *(pl* **-men***)* qardemarin *(ali hərbi dəniz donanmasında rütbə etibarı ilə leytenantdan aşağı olan zabit)*; 2. zabit rütbəsi almaq üçün dəniz donanmasında təhsil alan tələbə

**midsummer** ['mɪdsʌmə'] *n* yayın ortası

**midway[1]** [ˌmɪd'weɪ] *adj* yarıyol, yarı yolda olan

**midway[2]** [ˌmɪd'weɪ] *adv* yarı yolda, yolun ortasında

**midwife** ['mɪdwaɪf] *n* mamaça *(doğuş vaxtı qadına tibbi yardım edən qadın)*

**midwifery** ['mɪdwaɪfərɪ] *n* mamaçalıq; **to take a course in ~** mamaçalıq kursu keçmək

**mien** [mi:n] *n* mimika; sifətinin ifadəsi; çöhrə; görkəm, əda; **with a sorrowful ~** təəssüf ifadə edən mimika ilə; **of pleasing ~** xoş görkəm

**might[1]** [maɪt] *n* güc, qüdrət; qüvvət; **to work with all *one's* ~** var gücü ilə işləmək; **with ~ and main** var gücü ilə, can-başla

**might[2]** [maɪt] **may** *modal felinin pt forması*

**mighty** ['maɪtɪ] *adj* 1. qüdrətli, güclü; 2. nəhəng; **high and ~** qürurlu, təkəbbürlü, iddialı

**mightily** ['maɪtɪlɪ] *adv* güclü, bərk, şiddətlə, şiddətli, qüdrətli

**mignonette** [ˌmɪnjə'net] *n bot.* əspərək, məhəbbət çiçəyi, quruotu *(zanbağ fəsiləsindən olan ətirli gül bitkisi)*

**migraine** ['mi:greɪn] *n tib.* miqren *(kəskin baş ağrısı)*

**migrant** ['maɪgrənt] *n* köçkün, köçəri; mühacir; *Swallows are migrant Qaranquşlar köçəridir*; **~ labour** mühacir əməyi

**migrate** ['maɪgreɪt, *amer* maɪ'greɪt] *v* 1. köçmək; 2. köç etmək, mövsümlə əlaqədar yerlərini dəyişmək *(balıqlar və quşlar haq.)*

**migration** [maɪ'greɪʃn] *n* köç etmə; köçmə, mühacirət

**migratory** ['maɪgrətrɪ] *adj* köçəri; **~ birds** köçəri quşlar

**mikado** [mɪ'ka:dou] *n* mikado *(Yaponiya imperatorunun titulu)*

**mike** [maɪk] *n d.d.* **microphone** *sözünün qısa forması*

**milady** ['mɪleɪdɪ] *n fr.* miledi *(İngiltərədə imtiyazlı siniflərdən olan ərli qadına hörmətlə müraciət)*

**milage** ['maɪlɪdʒ] *n* = **mileage**

**milch** ['mɪltʃ] *adj* südverən, sağmal *(inək, camış və s.)*

**mild** [maɪld] *adj* yumşaq; mülayim, yüngül; **a ~ character** yumşaq xarakter; **a ~ climate** mülayim iqlim; **~ tobacco** boş/yumşaq tütün; **a ~ evening** mülayim axşam; **a ~ form of flu** qripin yüngül forması

**mildew** ['mɪldju:] *n* 1. *k.t.* mildyu, sibrə *(üzüm tənəklərinin göbələk xəstəliyi)*; *Roses were ruined*

*by mildew Qızılgüllər mildyu xəstəliyindən məhv oldu;* 2. kif; kif atma

**mildness** ['maıldnıs] *n* mülayimlik, yumşaqlıq; yüngüllük

**mile** [maıl] *n* 1. mil *(ölçü vahidi); For miles and miles there was nothing but desert Millərlə məsafədə səhradan başqa heç bir şey yox idi;* **to drive at 70 ~s perhour** saatda 70 mil sürətlə sürmək *(maşını);* 2. *d.d.* olduqca çox; *She is feeling miles better to day O, bu gün özünü çox yaxşı hiss edir*

**mileage** ['maılıdʒ] *n* millə ölçülən məsafə; **a used car with small ~** az sürülmüş maşın

**miler** ['maılə'] *n d.d. id.* 1 mil məsafəyə qaçış üzrə idmançı; *He is our best miler O bizim 1 mil məsafəyə qaçan ən yaxşı idmançımızdır*

**milestone** ['maılstoun] *n* 1. nişan ağacı, paya *(yolun kənarında, çöldə)*; 2. dövr, dönüş nöqtəsi, mərhələ, pillə

**milieu** ['mi:ljə:] [.mi:l'jə:] *n fr.* ətraf, ətraf mühit

**militancy** ['mılıtənsı] *n* mübarizlik, döyüşkənlik; *Chechen fighters are famous for their militancy Döyüşkənlik ruhuna görə çeçen döyüşçüləri məşhurdur*

**militant** ['mılıtənt] *adj* döyüşə hazır olan; güc və ya təzyiq tərəfdarı; döyüşkən; mübariz; *The students are less militant now İndi tələbələrdə mübarizə ruhu azalıb*

**militarism** ['mılıtərızəm] *n* militarizm, hərbçilik

**militarist** ['mılıtərıst] *n* militarist

**militaristic** [.mılıtə'rıstık] *adj* militarizm

**military** ['mılıtrı] *adj* hərbi, hərbə aid olan; **in ~ uniform** hərbi formada; **~ government** hərbi hökumət; **~ age** hərbiyə çağırış yaşı; **~ oath** hərbi and; **~ school** hərbi məktəb; **~ service** hərbi xidmət; **called up for ~ service** hərbi xidmətə çağırılmış; **the ~ detachment** ordu bölməsi/alayı

**militate** ['mılıteıt] *v* **(against)** qüvvəsi olmaq; əməliyyat aparmaq; mane olmaq, əngəl törətmək; qarşı çıxmaq; *Several factors combined to militate against our plans Bir sıra agentlər birləşərək bizim planımıza qarşı çıxdılar*

**militia** [mı'lıʃə] *n* milis; **a ~ man** milis nəfəri

**milk**[1] [mılk] *n* 1. süd; **dried/new/condensed ~** qurudulmuş /təzə/qatılaşdırılmış süd; **mother's ~** ana südü; **~ fresh from the cow** inəkdən sağılmış təzə süd; 2. *məc.* rəhm, şəfqət, mərhəmət, acıma; **the ~ of human kindness** insan övladına xas olan rəhm/ mərhəmət;

◊ *It's no use crying over spilt milk ≅ Keçənə güzəşt deyərlər*

**milk**[2] [mılk] *adj* 1. süd; **~ bar** süd məhsulları satılan dükan; **~ churn** süd daşıyan maşın; nehrə; **~ maid** südsağan/sağıcı qadın; **~ man** südsatan kişi; qapı-qapı düşüb süd toplayan adam; **~ powder** süd tozu, quru süd; **~ tooth** süd dişi; **~ white** süd kimi ağ; 2. südlü; bəzi ağaclarda südə bənzər maye; **~ loaf** südlü çörək; **~ weed** südlü bitki/ağac; 3. südəbənzər *(dərman haq.)*

**milk**[3] [mılk] *v* 1. süd sağmaq; 2. süd vermək; *The cows are milking well İnəklər yaxşı süd verir*

**milking machine** ['mılkıŋmə'ʃi:n] *n* südsağan maşın

**milky** ['mılkı] *adj* südlü; **the Milky way** *astr.* Süd yolu, ağ yol, kəhkəşan, samanyolu

**mill**[1] [mıl] *n* 1. dəyirman; **a water ~** su dəyirmanı; **a wind ~** yel dəyirmanı; **to put *smb.* through the ~** ≅ bir kəsi dəyirmanın boğazına salıb çıxarmaq, ≅ bir kəsi möhkəm sınamaq; 2. zavod, fabrik; **cotton ~** pambıq zavodu; **a paper ~** kağız fabriki; 3. kiçik həcmli üyüdücü maşın/aparat; **a coffee ~** qəhvəüyüdən maşın; **a pepper ~** istiotdöyən maşın

**mill**[2] [mıl] *adj* 1. dəyirman; **~ dam** nov *(dəyirmanın çarxına suyu gətirib axıdan taxta və ya dəmirdən düzəldilmiş novalça)*; **~ race** dəyirman daşını hərəkətə gətirən su; dəyirman suyu; **~ wheel** dəyirman çarxı; **~ stone** dəyirman daşı;

◊ **to have a ~ stone round *one's* neck** ≅ boynunda dəyirman daşı gəzdirmək; böyük çətinliyə məruz qalmaq; **to be a ~ round *one's* neck** boynunda ağır yük olmaq; *That mortgage has been like a mill stone round my neck O borc elə bil mənim boynumdan dəyirman daşı olub asılıb;* **to be between upper and nether ~ stone** çətin vəziyyətə düşmək, güclü təzyiqə məruz qalmaq;

**mill**[3] [mıl] *v* 1. üyütmək *(taxılı, dəni)*; **to ~ grain** taxıl üyütmək; **to ~ flour** un üyütmək; 2. polad tökmək; 3. *məc.* toplaşmaq; *People were milling about the square Adamlar meydana toplaşırdılar;* **to ~ about/around** ətrafına toplaşmaq; cəm olmaq

**millboard** ['mılbɔ:d] *n* kitab cildləmək üçün qalın karton

**millenarian** [.mılı'neərıən] *n* qızıl əsrin olacağına inanan insan

**millennium** [mı'lenıəm] *n* 1. milenium, minillik; 2. *məc.* qızıl əsr

**millepede** ['mılıpi:d] *n biol.* qırxayaq *(həşərat)*

**miller** ['mılə'] *n* dəyirmançı

**millet** ['mılıt] *n* darı

**milli** ['mılı] *n* milli *(ölçü vahidi, mində bir hissə)*; **~ gram** milliqram; **~ metre** millimetr

**milliard** ['mılja:d] *n* milyard

**millibar** ['mılıba:'] *n* millibar *(atmosfer təzyiq vahidi)*

**milliner** ['mılınə'] *n* 1. modistka *(qadın şlyapası istehsal edən və onun ticarəti ilə məşğul olan adam)*; 2. xırdavat malları satıcısı

**millinery** ['mılınərı] *n* 1. qadın şlyapası, lent və s. şeylərin ticarəti; 2. qadın şlyapası satışı

**million** ['mılıən] *n* milyon; **~s of workers** milyonlarla fəhlə; **six ~ people** altı milyon adam; **to make a ~** bir milyon pul qazanmaq

**millionaire** [.mıljə'neə'] *n* 1. milyoner, milyonçu; 2. hədsiz dərəcədə varlı adam



**millionfold** ['mılıənfould] *adv* milyon dəfə/qat

**millionth** ['mılıənθ] *adj* milyonuncu

**milometre,** *amer.* **milometer** [maı'lɔmıtə'] *n* milometr *(məsafəölçən cihaz)*

**milord** ['mılɔ:(d)] *n fr.* 1. ingilis lordu; 2. varlı adam

**milt** ['mılt] *n* balığın toxumu/kürüsü

**mime**[1] [maım] *n* pantomima *(mimika və hərəkətlə ifa olunan teatr tamaşası)*

**mime**[2] [maım] *v* 1. pantomima vasitəsi ilə ifadə etmək; 2. təqlid etmək; yamsılamaq

**mimeograph** ['mımıəgra:f] *n* mimeoqraf *(yazılı və ya çap edilmiş materialın surətini çıxaran aparat)*

**mimetic** [mı'metık] *adj* mühitə uyğunlaşan *(təbiətdə özünü müdafiə məqsədi ilə eyni rəng kəsb edən)*

**mimic**[1] ['mımık] *n* 1. mimik; yamsılayan; təqlidçi; *She is such a mimic O çox yaxşı təqlidçidir;* 2. təlxək

**mimic**[2] ['mımık] *adj* 1. təqlid edən, yamsılayan; 2. süni, qeyri-təbii

**mimic**[3] ['mımık] *v* **(-ck)** 1. yamsılamaq, təqlid etmək; *He was mimicking his uncle's voice and gestures very cleverly O öz əmisinin səsini və hərəkətlərini çox bacarıqla yamsılayırdı;* 2. bənzətmək, oxşatmaq; **wood painted to ~ marble** rənglənərək mərmərə bənzədilmiş taxta

**mimicry** ['mımıkrı] *n* mühitə uyğunlaşma *(düşməndən qorunmaq üçün quşun və heyvanların ətraf mühitin təbii rəngini alması)*

**mimosa** [mı'mouzə] *n bot.* küsdüm ağacı

**minaret** [.mınə'ret] *n* minarə *(məsciddə)*

**minatory** ['mınətərı] *adj* hədələyici, qorxuducu

**mince** [mıns] *v* 1. döymək; qiymələmək; qiymə etmək *(əti)*; 2. işvə/nazla danışmaq

◊ **not to ~ matters** düzünə/ əmmasız/ eyhamsız danışmaq; *Let's not mince the matters Gəl /Gəlin açıq danışaq*

**minced** ['mınst] *adj* döyülmüş; qiymələnmiş *(ət)*; **~ meat** döyülmüş ət; qiymə;

◊ **to make ~ meat** *d.d.* məğlubiyyətə uğratmaq, alt-üst etmək

**mincer** ['mınsə'] *n* ətdoğrayan/ətçəkən maşın; dəhrə; qiyməkeş

**mincing** ['mınsıŋ] *adj* 1. doğrayan; 2. işvəli, nazlı, nazsatan *(qız)*

**mincing-machine** ['mınsıŋmə'ʃi:n] *n* ət maşını, ətçəkən maşın

**mind**[1] [maınd] *n* 1. yaddaş; **to bear/to keep *smth.* in ~** bir şeyi yadda saxlamaq/ unutmamaq; **to bring *smth.* to ~** bir şeyi yada salmaq; **to put *smb.* in ~ of *smth.*** bir şeyi bir kəsə xatırlatmaq; 2. düşüncə; düşüncə tərzi; istək, hiss; niyyət; **absence of ~** huşsuzluq, yaddaşsızlıq; **presence of ~** özünü itirməmə; zirəklik; **to be out of *one's* ~ = not to be in *one's* right ~** ağlı başında olmamaq; nə etdiyini bilməmək; çaşıb qalmaq; **to be of one ~ about *smth.*** bir şey haqqında eyni fikirdə olmaq; **to be in two ~s about *smth.*** bir şey haqqında qəti fikrə gələ bilməmək, bir şey haqqında tərəddüd etmək; **to give *one's* ~ to *smth.*** diqqətini bir şeyə yönəltmək; **to change *one's* ~** fikrini dəyişmək; **to have half a ~ to do *smth.*** bir iş görməyə meyli olmaq; **to keep *one's* ~ on *smth.*** bir şeyi diqqət mərkəzində saxlamaq; *Keep your mind on what you are doing Diqqətin/Diqqətiniz gördüyün /gördüyünüz işdə olsun;* **to know *one's* own ~** nə istədiyini/etdiyini yaxşı bilmək; *He never knows his own mind O heç vaxt nə etdiyini özü də bilmir;* **to make up *one's* ~** qərara gəlmək/almaq; *I've made up my mind to be a doctor Mən həkim olmaq qərarına gəlmişəm; Have you made up your mind about what you'll do? Sən/Siz nə edəcəyini/edəcəyinizi qərara almısanmı/almısınızmı?;* **to read *smb.'s* ~** bir kəsin fikrini oxumaq; **to set *one's* ~ on *smth.*** bir şeyi qarşısına məqsəd qoymaq, bir şeyi çox istəmək; *We've set our minds on a holiday in France Biz Fransada məzuniyyət keçirmək niyyətinə düşmüşük;* **to speak *one's* ~** ürəyindən keçəni demək; **to take *smb.'s* ~ off *smth.*** bir kəsin fikrini bir şeydən yayındırmaq; **to my ~ ...** məncə..., mənə görə...; *To my mind this is just nonsence Məncə, bu boş şeydir/cəfəngiyyatdır;* 3. təfəkkür; *He has a very good mind Onun yaxşı təfəkkürü var; He has one of the great minds of the age O, əsrin ən dahi təfəkkür sahiblərindən biridir;*

◊ *No two minds think alike Ağıl ağıldan ötkəm olar; Out of sight, out of mind Gözdən uzaq, könüldən iraq*

**mind**[2] [maınd] *v* 1. qayğısına qalmaq; baxmaq; *Who is minding the baby? Uşağa kim baxır? When Mr. Green was called to the phone, his wife had to mind the shop Mister Qrin telefona çağırıldıqda dükana onun arvadı baxmalı olurdu;* 2. özünü qorumaq; ehtiyatlı olmaq; diqqət yetirmək; *Mind your head Başından muğayat ol, Başını qoru; Mind the dog! İtdən ehtiyatlı ol/olun! Mind that you don't forget Diqqətli ol/olun ki, yaddan çıxarmayasan/çıxarmayasınız;* **to ~ out for *smth.*** bir şeydən diqqətli olmaq; *Could you mind out please I want to pass Ehtiyatlı ol/olun, mən keçmək istəyirəm; When you go into the garden remember to mind out for the new seedings Bağa getdikdə, ehtiyatlı ol/ olun ki, yeni səpilmiş toxumları tapdalamayasan/tapdalamayasınız; Mind your own business Öz işinlə/işinizlə məşğul ol/ olun;* 3. narahat olmaq; etiraz etmək; *He doesn't mind the cold weather O, soyuq havanı heç vecinə də almır; Do you mind if I smoke here? Mən burada papiros çəksəm, sən/siz etiraz etməzsən/etməzsiniz ki?; Do you mind leaving this payment until next year Əgər mən gələn ilə qədər bu borcu*

*ödəməsəm, sən/siz etiraz etməzsən/ etməzsiniz ki?; I shouldn't mind a glass of iced beer Mən bir stəkan buzlu pivəyə etiraz etməzdim;*
◊ **never** ~ *Narahat olma; Eyb etməz*

**minder** ['maındəʳ] *n* qulluq göstərən adam; **machine** ~ maşına baxan adam; **baby** ~ uşağa baxan adam

**minded** ['maındıd] *adj* meylli, niyyətində/ könlündə olan; ~ **to do** ***smth.*** bir iş görməyə meylli; *He could do it if he were so minded Əgər onun meyli olsaydı, o bunu edə bilərdi;* **strong** ~ qətiyyətli, səbatlı; **high** ~ **leaders** çox qətiyyətli/səbatlı liderlər; **evil** ~ şərniyyətli, bədniyyətli; **commercially** ~ **man** kommersiyadan başı çıxan adam

**mindful** ['maındful] *adj* diqqətli; ehtiyatlı; **to be** ~ **of** ***one's*** **duties** öz vəzifəsinə diqqətli olmaq

**mindfulness** ['maındfəlnıs] *n* diqqətlilik, ehtiyatlılıq

**mindless** ['maındlıs] *adj* 1. diqqətsiz; huşsuz; yaddaşsız; ~ **of** ***smth.*** bir şeyə əhəmiyyət verməyən; ~ **of danger** təhlükəyə əhəmiyyət verməyən; 2. təfəkkürsüz; beyinsiz

**mindlessness** ['maındlısnıs] *n* 1. huşsuzluq, diqqətsizlik; 2. ehtiyatsızlıq

**mine**[1] [maın] *n* 1. şaxta; mədən; **coal** ~ kömür mədəni/şaxtası; **gold** ~ qızıl mədəni; 2. *məc.* ensiklopediya, xəzinə; *My grandfather is a mine of information Mənim babam canlı ensiklopediyadır;* 3. partlayıcı maddələrin yerləşdirilməsi üçün yer/tunel; *The lorry was destroyed by a buried mine Yük maşını yerə basdırılmış minanın partlaması nəticəsində dağıldı;* 4. mina *(partlayıcı maddə)*

**mine**[2] [maın] *adj* mina; ~ **detector** mina axtaran; ~ **disposal** minanı zərərsizləşdirmə; minadan təmizləmə; ~ **field** minalı sahə; ~ **layer** minalayan; mina düzən; ~ **laying vessel** mina basdıran gəmi *(dənizdə)*; ~ **sweeper** minadan təmizləyən gəmi; ~ **sweeping** minadan təmizləmə

**mine**[3] [maın] *poss. pron.* mənim, mənimki; *This is mine Bu mənimkidir; He is an old friend of mine O mənim köhnə dostumdur*

**mine**[4] [maın] *v* 1. kömür/qızıl və s. çıxarmaq; **to** ~ **the earth for coal/gold** kömür/qızıl çıxarmaq üçün yeri qazmaq; *Gold is mined from deep under ground Qızıl torpağın dərinliyindən çıxarılır;* 2. tunel qazmaq; lağım atmaq; 3. minalamaq, mina düzmək; *Mine the entrance to the harbour Limanın girişini minala/minalayın*

**miner** ['maınəʳ] *n* 1. şaxtaçı, qazmaçı; 2. mina düzən *(əsgər)*

**mineral**[1] ['mınərəl] *n* mineral; *This land is rich with minerals Bu topaq minerallarla zəngindir*

**mineral**[2] ['mınərəl] *adj* 1. mineral; ~ **water** mineral su; 2. qeyri-üzvi, süni; ~ **wool** süni yun

**mineralogist** ['mınərælıdʒıst] *n* 1. mineralogiya fakültəsinin tələbəsi; 2. mineraloq *(mineralogiya mütəxəssisi)*

**mineralogy** ['mınərælədʒı] *n* mineralogiya *(minerallar haq. elm)*

**mingle** ['mıŋgl] *v* qarışdırmaq; qarışmaq, qatışmaq; **truth ~d with falsehood** riya ilə qarışmış həqiqət; **to** ~ **with** qoşulmaq, qarışmaq; **two rivers that join and** ~ bir-birinə qovuşan və qarışan iki çay

**mingy** ['mındʒı] *adj d.d.* xəsis; **a** ~ **fellow/ person** xəsis oğlan/adam

**mini** ['mını] *adj* mini, kiçik ölçülü; ~ **bus** mini/kiçik ölçülü avtobus; ~ **cab** mini/kiçik ölçülü fayton; ~ **tour** kiçik səyahət

**miniature** ['mınıtʃəʳ] *n* 1. miniatür *(kiçik ölçülü sənət əsəri)*; **in** ~ kiçik həcmdə; 2. hər hansı bir obyektin kiçik ölçülü modeli

**miniaturist** ['mınıtʃərıst] *n* miniatür əsərlər çəkən/yaradan rəssam

**minim** ['mınım] *n* 1. ən kiçik hissə; damla, damcı; 2. boş /vecsiz/dəyərsiz şey; 3. *mus.* yarım not

**minimal** ['mınıml] *adj* ən kiçik/az; ~ **parts of words** sözlərin ən kiçik hissələri; *On this cliffs vegetation is minimal Bu qayalarda yaşıllıq minimaldır/çox azdır*

**minimize, -ise** ['mınımaız] *v* kiçiltmək, azaltmaq, minimuma endirmək; **to** ~ **an accident** hadisənin əhəmiyyətini azaltmaq/ kiçiltmək/ minimuma endirmək

**minimum** ['mınıməm] *n* minimum; **a** ~ **wage** minimum əməkhaqqı/maaş

**mining** ['maınıŋ] *n* dağ-mədən işləri, dağ-mədən sənayesi; **a** ~ **engineer** mədən mühəndisi; **the** ~ **industry** dağ-mədən sənayesi; **open-cast** ~ səthə yaxın yerdən kömür qazıb çıxarma; açıq üsulla kömür hasilatı

**minion** ['mınıən] *n* müti qul, itaətkar nökər; **the ~s of the law** qanun keşikçiləri *(polis, hakim və s.)*

**minister**[1] ['mınıstəʳ] *n* 1. nazir; **the** ~ **of Home Affairs** daxili işlər naziri; 2. keşiş

**minister**[2] ['mınıstəʳ] *v* 1. xidmət/kömək etmək; **to** ~ **to** ***smb.*** bir kəsə xidmət/kömək etmək; **to** ~ **to the wants of a sick man** xəstə adama xidmət etmək; **to** ~ **to** ***one's*** **husband's/ wife's needs** ərinin/arvadının ehtiyaclarını ödəmək; 2. ibadət etmək; keşiş olmaq

**ministerial** [ˌmını'stıərıəl] *adj* nazir, nazirliyə aid olan; ~ **functions/duties** nazir funksiyaları/vəzifələri; **the** ~ **benches** nazir stolları/kürsüləri

**ministrant** ['mınıstrənt] *adj* inzibatçı; administrator; köməkçi

**ministration** [ˌmını'streıʃn] *n* 1. ibadət xidməti *(kilsədə)*; 2. xidmət; qulluq; **thanks to the ~s of my devoted wife** mənim vəfalı arvadımın qulluğu sayəsində

**ministry** ['mınıstrı] *n* 1. nazirlik; **Ministry of Finance** Maliyyə nazirliyi; **Foreign Ministry, Ministry of Foreign Affairs** Xarici İşlər naziriliyi; 2. keşişlər heyəti; **to enter the** ~ kilsədə qulluğa girmək; 3. kilsədə dini xidmət



**miniver** ['mınıvəʳ] *n zool.* sincab dərisi

**mink** [mıŋk] *n zool.* 1. su samuru; 2. su samuru xəzi

**minnow** ['mınou] *n* qumlaqçı *(çəki balıqları fəsiləsindən kiçik çay balığı)*

**minor** ['maınəʳ] *adj* 1. az əhəmiyyətli, ikinci dərəcəli; ~ **repairs** xırda təmirlər; **a broken leg and** ~ **injuries** qırılmış qıç və xırda zədələr; 2. kiçik; **the** ~ **planets** kiçik planetlər; ~ **poets** kiçik şairlər; 3. balaca; **Smith the** ~ balaca Smit; 4. *mus.* minor *(not)*; **in a** ~ **key** qəmli/həzin not

**minority**[1] [maı'nɒrıtı] *n* 1. 18 yaşdan kiçik olanlar; 2. az sayda və ya ölçüdə olan; **to be in the** ~ azlıqda qalmaq *(səsvermə zamanı və s.)*; *We are in the minority Biz azlıqda qalmışıq*

**minority**[2] [maı'nərıtı] *adj* azlıqda qalan; ~ **government** azlıqda qalanların hökuməti; ~ **programme** azlıqda qalanların proqramı; ~ **report** azlıqda qalanların məlumatı/bəyanatı

**Minotaur** ['maınətɔ:] *n* monstr *(yarı insan, yarı öküz şəklində olan mifik məxluq)*

**minster** ['mınstəʳ] *n* böyük kilsə

**minstrel** ['mınstrəl] *n* 1. menestrel *(orta əsrlərdə İngiltərədə və Fransada gəzərgi şair və çalğıçı)*; 2. ictimai əyləncə təşkil edən kompaniya

**mint**[1] [mınt] *n* I nanə

**mint** [mınt] *n* II 1. sikkə kəsilən yer; **coins fresh from the** ~ dəzgah altından təzə çıxmış sikkələr; 2. böyük məbləğ; **a** ~ **of money** böyük məbləğ pul; **to make/to earn a** ~ **of money** böyük məbləğ pul qazanmaq; 3. kəsilmiş medal /marka

**mint**[2] [mınt] *v* kəsmək *(sikkə, medal və s.)*

**minus** ['maınəs] *n* 1. minus, çıxma işarəsi; **a** ~ **quantity** mənfi kəmiyyət; 2. azaltma, çıxma; *7 minus 4 is 3 7 çıxaq 4 3 eylər;* 3. əskik; -sız, -siz, -suz, -süz; *He came back from the war minus a leg O, müharibədən bir qıçsız qayıtdı*

**minuscule** ['mınəskju:l] *adj* həddən artıq kiçik/ balaca

**minute**[1] ['mınıt] *n* 1. dəqiqə; **to arrive ten ~s early** on dəqiqə tez çatmaq/gəlmək; **a** ~ **gun** hər dəqiqədən bir atəş açan tüfəng; ~ **hand** saatın dəqiqəsini göstərən əqrəb; **a** ~ **man** əmrə müntəzir (dayanmış) polis nəfəri; **in a** ~ bir dəqiqədən sonra, tezliklə; bu dəqiqə; *I'll come downstairs in a minute Mən bir dəqiqəyə aşağı düşəcəyəm;* **the** ~ **that** kimi, həmin dəqiqə; *I'll give him your letter the minute that he arrives O çatan kimi mən sizin məktubunuzu ona verəcəyəm;* 2. son; müasir, çağdaş; **up to the** ~ dəbdə olan; son dəbdə olan; **up to the** ~ **information** son məlumata əsasən; **up to the** ~ **hairstyles** son dəbdə olan saç düzümləri; 3. 60-da bir dərəcə *(bucaqda)*; 4. protokol; icmal; ümumi məlumat; *Read the minutes of the last meeting Son iclasın protokollarını oxu/ oxuyun*

**minute**[2] ['mınıt] *adj* 1. çox kiçik; zərrəcik; ~ **particles of gold dust** qızıl tozu zərrəcikləri; 2. xırda təfsilatlar verən; dəqiq və diqqətli; **a** ~ **description** dəqiq təsvir; **the ~est details** ən kiçik təfsilatlar

**minute**[3] ['mınıt] *v* 1. protokolda qeyd etmək; protokola salmaq; 2. memorandum şəklində qeyd etmək

**minutely** ['mınıtlı] *adv* ən kiçik təfsilatlarla, dəqiq, incəliyə varmaqla

**minuteness** ['mınıtnıs] *n* xırdalıq; incəlik, dəqiqlik

**minutiae** [maı'nju:ʃıi:] *n* dəqiq/sınanmış təfsilatlar /təfərrüatlar

**minx** ['mıŋks] *n* ləçər; əxlaqsız, pozğun, bihəya; həyasız; abırsız *(qız)*

**miracle** ['mırəkl] *n* 1. möcüzə; *Her life was saved by a miracle Onun həyatı bir möcüzə sayəsində xilas edildi; The doctors say that her recovery is a miracle Həkimlər deyirlər ki, onun sağalması bir möcüzədir;* 2. diqqətəlayiq şey/hadisə /nümunə; *It is a miracle of beauty O, gözəllik nümunəsidir*

**miraculous** [mı'rækjuləs] *adj* möcüzəli, möcüzəvi, möcüzəyəbənzər; ecazkar

**miraculously** [mı'rækjuləslı] *adv* möcüzəli şəkildə/tərzdə, ecazkarlıqla

**mirage** [mı'ra:ʒ] *n* 1. ilğım; miraj; 2. *məc.* xəyal, xülya

**mire**[1] ['maıəʳ] *n* bataqlıq, bataqlıq yer;
◊ **to be in the** ~ bataqlıq girdabına düşmək; çətinliyə məruz qalmaq; **to drag** ***smb./smb.'s*** **name through the** ~ bir kəsi ləkələmək/ bədnam/biabır etmək

**mire**[2] ['maıəʳ] *v* 1. palçığa batmaq; 2. bataqlığa düşmək

**mirror**[1] ['mırəʳ] *n* 1. ayna, güzgü; **hand** ~ əl güzgüsü; **magic** ~ sehrli güzgü; **a wing** ~ yan güzgü *(maşında və s.)*; 2. *məc.* əks etdirmə; *His diary is the mirror of the time he lives in Onun gündəliyi yaşadığı dövrün güzgüsüdür /dövrü əks etdirir*

**mirror**[2] ['mırəʳ] *v* güzgü kimi əks etdirmək; *The still water of the lake mirrored the hillside Gölün sakit suyu ətrafdakı təpəliyi güzgü kimi əks etdirirdi*

**mirth** [mə:θ] *n* şuxluq; şənlik, gümrahlıq, oynaqlıq, şaqraqlıq

**mirthful** ['mə:θfl] *adj* şux; şən, gümrah, oynaq; şaqraq

**mirthfully** ['mə:θfəlı] *adv* gümrahlıqla, gümrahcasına, gümrah/şaqraq bir tərzdə

**mirthless** ['mə:θlıs] *adj* qəmli, ölgün, zəif, ölüvay; **a** ~ **laugh** qəmli gülüş

**miry** ['maıərı] *adj* 1. palçıqlı; 2. bataqlı; ~ **roads** palçıqlı/bataqlı yol

**misadventure** [ˌmısəd'ventʃəʳ] *n* bəxtsizlik, bəxti gətirməməzlik; uğursuzluq; bədbəxtçilik; qəza; **death by** ~ qəza nəticəsində ölüm

**misadvise** [ˌmısəd'vaız] *v* səhv məsləhət vermək; düzgün yol göstərməmək

**misalliance** [ˌmɪsəˈlaɪəns] *n* uyğun olmayan ittifaq; yanlış evlilik *(xüs. nikah)*
**misanthrope** [ˈmɪznθroup] *n* mizantrop *(insanlara, cəmiyyətə nifrət edən adam)*
**misanthropic** [ˈmɪznˈθrɔpɪk] *adj* mizantropik *(insanlara və cəmiyyətə nifrətli)*
**misanthropy** [ˈmɪznθrɔpɪ] *n* mizantropiya *(insanlara və cəmiyyətə nifrət hissi)*
**misapply** [ˌmɪsəˈplaɪ] *v* yerində/düzgün işlətməmək; səhv işlətmək; *This word is often misapplied Bu söz çox zaman/vaxt səhv işlədilir*
**misapprehend** [ˌmɪsæprɪˈhend] *v* səhv başa düşmək; düz anlamamaq
**misapprehension** [ˌmɪsæprɪˈhenʃn] *n* başa düşməmə; səhv anlama; pis başa düşmə; **to do** *smth.* **under a ~** bir şeyi başa düşməməzlikdən/qanmamazlıqdan etmək
**misappropriate** [ˌmɪsəˈprəuprɪeɪt] *v* **1.** səhv istifadə etmək; yerində işlətməmək *(sözü)*; **2.** lazımi yerə işlətməmək *(pulu)*; qeyri-qanuni yiyələnmək, əmanətə xəyanət etmək; *The treasurer misappropriated the society's funds Xəzinədar cəmiyyətin fondunu mənimsədi*
**misappropriation** [ˌmɪsəprəuprɪˈeɪʃn] *n* əmanətə xəyanət etmə; təyinatı üzrə xərcləməmə; **~ of the public fund** ictimai fondu mənimsəmə/israf etmə
**misbegotten** [ˌmɪsbɪˈgɔtən] *adj* **1.** qeyri-qanuni doğulan, bic, haramzada; **2.** *d.d.* yaramaz; iyrənc; *Who is the author of this misbegotten? Bu yaramaz planın müəllifi kimdir?*
**misbehave** [ˌmɪsbɪˈheɪv] *v* özünü pis aparmaq; nalayiq davranmaq
**misbehaviour** [ˌmɪsbɪˈheɪvɪəʳ] *n* pis/nalayiq davranış, yaramazlıq, nalayiqlik
**miscalculate** [ˌmɪsˈkælkjuleɪt] *v* səhv saymaq/hesablamaq
**miscalculation** [ˌmɪskælkjuˈleɪʃn] *n* səhv sayma /hesablama
**miscall** [ˌmɪsˈkɔ:l] *v* səhv adla çağırmaq; adını səhv demək/təhrif etmək
**miscarriage** [ˌmɪsˈkærɪdʒ] *n* **1.** *hüq.* səhv hökm /qərar; qanun pozuntusu; **~ of justice** ədalətin pozulması; **2.** bir şeyi bir yerə çatdıra bilməmə; bir yerə çata bilməmə; **~ of goods** malların vaxtında çatdırılmaması; **3.** *tib.* uşaq saldırma; uşaq salma; bala salma/tullama *(heyvanlarda)*
**miscarry** [ˌmɪsˈkærɪ] *v (pt, pp* **-ried) 1.** yerinə yetirə bilməmək; gözlənilən nəticəyə nail olmamaq *(planda və s.)*; **2.** düzgün ünvanına çatmamaq *(məktub, teleqram və s.)*; **3.** uşaq salmaq/saldırmaq; bala salmaq/tullamaq *(heyvanlarda)*
**miscast** [ˌmɪsˈka:st] *v (pt, pp* **miscast) 1.** aktyora uyğun/ müvafiq olmayan rol vermək; *She was badly miscast as Leyli O, Leyli roluna yaramırdı*; **2.** rolları düzgün paylaşdırmamaq
**miscegenation** [ˌmɪsɪdʒɪˈneɪʃn] *n* qarışmış irqlər *(xüs. ağ və zəncilər arasında)*
**miscellaneous** [ˌmɪsæˈleɪnɪəs] *adj* qarışıq; müxtəlif, çeşidli; **a ~ collection of goods** qarışıq malların kolleksiyası; **a ~ collection of stories** müxtəlif müəlliflərin hekayələrindən ibarət olan
**miscellany** [mɪˈselənɪ] *n* **1.** almanax, toplu; **2.** qarışıq, qatışıq, xəlitə
**miscellanea** [ˌmɪseˈleɪnɪə] *n* **miscellany** *isminin cəm forması*
**mischance** [mɪsˈtʃa:ns] *n* şanssızlıq, bəxti/şansı gətirməməzlik; bəxtsizlik; **by ~, through a ~** bədbəxtlikdən, bəxtin gətirməməsi ucbatından
**mischief** [ˈmɪstʃɪf] *n* **1.** ziyan, zərər; şuluqluq; **a storm that did much ~ to shipping** gəmiçiliyə çox ziyan vuran fırtına; **to do** *smb.* **a ~** bir kəsə pislik/yamanlıq etmək; **2.** mənəvi ziyan, xətər; əngəl; *Such wild speeches may work great mischief Belə köntöy danışıqlar çox böyük əngəl törədə bilər; That child is a little mischief O uşaq bir az/qədər şuluqdur*; **to get into ~ 1)** dəcəllik/nadinclik etmək, şuluqluq salmaq; **2)** əngələ /bəlaya düşmək; **to make ~ (between)** ara vurmaq; küsü salmaq; **3.** dəcəllik, nadinclik; *Those boys are regular mischiefs O oğlanlar həmişə nadinclik/dəcəllik edirlər;*
◊ *He that mischief hatches, mischief catches ≅ Başqasına quyu qazan özü düşər*
**mischievous** [ˈmɪstʃɪvəs] *adj* **1.** ziyanlı; zərərli, müzür, xətərli, acı, zəhərli; **~ tongue** acı/zəhərli dil; **a ~ letter** hirslə/qəzəblə yazılmış məktub; **a ~ rumour** ziyanlı/xətərli şayiə; **2.** riyakar; bədniyyət; aldadan; kələkbaz; **~ look /trick** bədniyyət baxış/kələk; **as ~ as a monkey** meymun kimi adam oynadan/ hiyləgər
**misconceive** [ˌmɪskənˈsi:v] *v* **1.** səhv başa düşmək, aldanmaq; **2.** səhv anlayışa malik olmaq; **to ~ of** *one's* **duty** öz vəzifə borcunu dərk etməmək/başa düşməmək
**misconception** [ˌmɪskənˈsepʃn] *n* düzgün dərk etməmə, anlamama; səhv anlayış/təsəvvür
**misconduct**[1] [ˌmɪsˈkɔndʌkt] *n* **1.** pis/səhv davranış; **2.** pis idarəçilik, işin öhdəsindən gələ bilməmə
**misconduct**[2] [ˌmɪskənˈdʌkt] *v* **1.** pis davranmaq; **2.** pis idarə etmək; işin öhədsindən gələ bilməmək; **to ~** *one's* **business affairs** biznes işlərini apara bilməmək; işlərin öhdəsindən gələ bilməmək
**misconstruction** [ˌmɪskənˈstrʌkʃn] *n* səhv yozma/anlama; təhrif; *Your words are open to misconstruction Sənin/Sizin sözlərini/ sözlərinizi səhv yozmaq olar*
**misconstrue** [ˌmɪskənˈstru:] *v* səhv nəticə çıxarmaq; düzgün anlamamaq; təhrif etmək; *You have misconstrued my words Sən/Siz mənim sözlərimi səhv başa düşmüsən/ düşmüsünüz*
**miscount**[1] [mɪsˈkaunt] *n* səhv sayma *(xüs. seçki zamanı: səsləri)*



**miscount**[2] [ˌmɪsˈkaunt] *v* səhv saymaq; yanlışlığa yol vermək
**miscreant** [ˈmɪskrɪənt] *n* yaramaz; şərxata
**misdate** [ˈmɪsˈdeɪt] *v* səhv tarix qoymaq *(məktuba, teleqrama və s.)*
**misdeal** [ˈmɪsˈdi:l] *v* səhv paylamaq *(kartları: kart oyununda); I've got misdeal Mənim kartım səhv paylanıb (ya artıq, ya da əskikdir)*
**misdeed** [ˌmɪsˈdi:d] *n* nalayiq/yaramaz hərəkət; şərəfsiz iş; cinayət; **to be punished for** *one's* **~** cinayətinə görə cəzalandırılmaq
**misdemeanour** [ˌmɪsdɪˈmi:nəʳ] *n hüq.* cinayət tərkibli əməl; cinayət işi
**misdirect** [ˌmɪsdɪˈrekt] *v* səhv istiqamətləndirmək/göndərmək; **~ a letter** məktubu səhv ünvana göndərmək; **to ~** *one's* **energies or abilities** enerjisindən və ya qabiliyyətindən düzgün istifadə etməmək; **~ a jury** hakimi səhv istiqamətə yönəltmək
**misdirection** [ˌmɪsdɪˈrekʃn] *n* səhv istiqamətləndirmə; səhv istiqamətə yönəltmə
**misdoing** [ˈmɪsdu:ɪŋ] *n* = **misdeed**
**miser** [ˈmaɪzəʳ] *n* var-dövlət hərisi; simic, xəsis, zıqqı *(adam)*
**miserable** [ˈmɪzrəbl] *adj* **1.** miskin; yazıq, məlul; məzlum; çarəsiz; **~ slums** miskin xarabalıqlar; **~ from cold and hunger** soyuq və aclıqdan çarəsiz; **the ~ lives of the refugees in Azerbaijan** Azərbaycanda qaçqınların miskin həyatı; **2.** pis, iyrənc; **~ weather** pis/iyrənc hava; **3.** az, cüzi, kiçik; *What a miserable pension after 50 years of hard work! Əlli il ağır zəhmətdən sonra necə də az/cüzi təqaüd!*
**miserably** [ˈmɪzərəblɪ] *adv* miskin, yazıq, yazıq-yazıq, acınacaqlı halda, bədbəxt; **to die ~** kasıblıq içində ölmək
**miserliness** [ˈmaɪzəlɪnɪs] *n* xəsislik; simiclik
**miserly** [ˈmaɪzəlɪ] *adj* xəsis, simic
**misery** [ˈmɪzərɪ] *n* **1.** əzab, əziyyət, əzab-əziyyət; iztirab; məşəqqət; **to be in a ~** əzaba/əziyyətə düçar olmaq; **to live in a ~ and want** məşəqqət və ehtiyac içində yaşamaq; **2.** bəla; dəhşət; **the miseries of the mankind** bəşəriyyətin bəlaları; **3.** *d.d.* özünü yazıq/məzlum göstərən adam; *I've had enough of your complaints; don't be a misery Sənin/Sizin şikayətlərini/şikayətlərinizi çox eşitmişəm; özünü/özünüzü məzlum göstərdiyin / göstərdiyiniz bəsdir*
**misfire**[1] [ˈmɪsfaɪəʳ] *n* hədəfdə yayınma; hədəfə düşməmə; oxu daşa dəymə
**misfire**[2] [ˌmɪsˈfaɪəʳ] *v* **1.** hədəfi vura bilməmək; hədəfə düşə bilməmək; **2.** *d.d.* gözlədiyinə nail ola bilməmək; oxu daşa dəymək
**misfit** [ˈmɪsfɪt] *n* **1.** yaraşmayan paltar; **2.** *məc.* vəzifəsinə yaraşmayan/yerində olmayan adam
**misfortune** [ˌmɪsˈfɔ:tʃən] *n* bəxtsizlik; bəxti gətirməməzlik; uğursuzluq; **to suffer ~** bəxti gətirməmək; **companions in ~s** eyni bəlaya düçar/mübtəla olmuş adamlar; bədbəxtlik; bədbəxt hadisə; *He bore his misfortunes bravely O öz bədbəxtliyinə dəyanətlə sinə gərdi*
**misgive** [ˈmɪsgɪv] *v* yanılmaq; şübhəyə düşmək; *My heart misgives me Mənim ürəyimə şübhə düşüb*
**misgiving** [ˌmɪsˈgɪvɪŋ] *n* şübhə; inamsızlıq; tərəddüd; **a heart full of ~s** şübhə ilə dolu ürək
**misgovern** [ˌmɪsˈgʌvn] *v* dövləti, idarəni və s. pis idarə etmək/idarə etməyi bacarmamaq
**misgovernment** [ˌmɪsˈgʌvnmənt] *n* pis idarəçilik; dövlət idarəçiliyində səriştəsizlik
**misguide** [ˌmɪsˈgaɪd] *v* səhv yol göstərmək; səhv istiqamətə yönəltmək
**misguided** [ˌmɪsˈgaɪdɪd] *adj* səhv; yanlış, aldadılmış, azdırılmış
**mishandle** [ˌmɪsˈhændl] *v* **1.** kobud davranmaq; **2.** səhv qurmaq *(saatı); This watch has been mishandled Bu saatı səhv qurublar*
**mishap** [ˈmɪshæp] *n* bədbəxt hadisə; **to meet with a ~** bədbəxt hadisə ilə rastlaşmaq; **to arrive home after many ~s** min cür xata-bəladan sovuşub evə çatmaq
**mishmash** [ˈmɪʃmæʃ] *n* dolaşıq kələf; açılmaz düyün
**misinform** [ˌmɪsɪnˈfɔ:m] *v* səhv/yanlış məlumat vermək; *You've been misinformed Sənə/Sizə yanlış məlumat veriblər*
**misinterpret** [ˌmɪsɪnˈtə:prɪt] *v* yanlış izah etmək; məlumatı yanlış yozmaq; *He misinterpreted the girl's silence as giving consent O, qızın sükutunu səhvən razılıq kimi qəbul etdi*
**misjudge** [ˈmɪsdʒʌdʒ] *v* səhv mühakimə yürütmək; yanlış qənaətə gəlmək; *You have misjudged my motives Sən/Siz mənim niyyətlərim haqqında yanlış qənaətə gəlmisən / gəlmisiniz*
**mislay** [ˌmɪsˈleɪ] *v (pt, pp* **mislaid** [-leɪd] yerini səhv salmaq; yerini unutmaq; *I've mislaid my passport Mən pasportumun yerini unutmuşam*
**mislead** [ˌmɪsˈli:d] *v (pt, pp* **misled) 1.** azdırmaq; səhv yol göstərmək; **to ~** *smb.* bir kəsi azdırmaq/səhv yola istiqamətləndirmək; ağzını səhv yola salmaq; **to be misled by a guide** bələdçi tərəfindən azdırılmaq; **2.** yolundan döndərmək; pis yola salmaq/sövq etmək
**misleading** [ˌmɪsˈli:dɪŋ] *adj* azdırıcı, yanlış; **~ answer** azdırıcı/yanlış cavab
**mislike**[1] [mɪsˈlaɪk] *n* xoşu gəlməməzlik; bəyənməmə, istəməmə
**mislike**[2] [mɪsˈlaɪk] *v* bəyənməmək, xoşlamamaq; ürəyi istəməmək
**mismanage** [ˈmɪsˈmænɪdʒ] *v* pis idarə etmək; düzgün idarə etməmək
**mismanagement** [ˈmɪsˈmænɪdʒmənt] *n* pis/səhv idarəçilik
**mismatch**[1] [mɪsˈmætʃ] *n* **1.** yaraşmama; uyğunsuzluq; **2.** pis ər-arvad *(nikahla birləşən ittifaq)*; **3.** *tex.* mexanizmlərin bir-birinə uyğun gəlməməsi

saçını pırtlaşdırmaq; saçının səliqəsini pozmaq; 2. bulaşdırmaq; çirkləndirmək; ləkə salmaq *(paltara)*; **to ~ up *one's* dress** paltarını əzmək/bulaşdırmaq; **to ~ up *one's* hand** əllərini çirkləndirmək/ bulaşdırmaq; 3. qarışdırmaq, dolaşdırmaq, dolaşıq salmaq; 4. özünü itirmək, çaş-baş qalmaq; *I am all mussed up Mən özümü tamamilə itirmişəm*

**mussel** [ˈmʌsl] *n zool.* 1. ikitaylı/ikilaylı balıqqulağı; 2. midi *(dəniz molyusku)*

**mussitate** [ˈmʌsıteıt] *v arx.* mırtıldamaq, donquldanmaq, öz-özünə /burnunun altında danışmaq

**Mussulman**[1] [ˈmʌslmən] *n* müsəlman

**Mussulman**[2] [ˈmʌslmən] *adj* müsəlman; müsəlmana aid olan

**mussy** [ˈmʌsı] *adj amer.* 1. dağılmış, əzilmiş *(paltar və s. haq.)*; 2. pərişan, dağınıq *(saç haq.)*

**must**[1] [mʌst] *n* I *d.d.* vaciblik, lazımlıq; ehtiyac; *On a rainy weather a raincoat is a must Yağışlı havada plaş vacibdir/gərəkdir; I want to see the film; they say it's a must Mən bu filmi görmək istəyirəm; deyirlər ki, onu görmək vacibdir*

**must** [mʌst] *n* II 1. must *(gəlməmiş/yetişməmiş təzə çaxır)*; 2. cecə *(alma, armud cecəsi)*

**must** [mʌst] *n* III kif; kəf

**must** [mʌst] *n* IV ov vaxtı *(dəvə və fillər üçün)*

**must**[2] [mʌst] *v* I *modal fel. Aşağıdakı mənaları ifadə edir:* 1. vaciblik: *Bu halda Azərbaycan türkcəsində vaciblik ifadə edən* **-malı, -məli** *şəkilçisinə uyğun gəlir; They* **must** *read this book Onlar bu kitabı oxu***malı***dırlar; I* **must** *go at once Mən dərhal get***məli***yəm; I* **must** *see him tomorrow Mən sabah onu gör***məli***yəm; He* **must** *buy this book O bu kitabı al***malı***dır*; 2. qadağa, yasaq: *Bu mənalarda adətən inkar cümlələrində işlənir və Azərbaycan türkcəsində yenə də* **-malı, -məli** *şəkilçilərinə uyğun gəlir; He* **must** *not touch this book O bu kitaba toxunma***malı***dır; He* **must** *not go to the cinema today O bu gün kinoya getmə***məli***dir*; 3. güman, ehtimal; *Bu halda* **must** *feli Azərbaycan türkcəsində* **güman ki, ehtimal ki** *sözlərinə uyğun gəlir:* 1) *Hərəkət gələcəyə aid olduqda* **must** *felindən sonra məsdər qeyri-müəyyən formada işlənir; He must come by the night train Güman ki/Ehtimal ki, o, gecə qatarı ilə gələcək;* 2) *Hərəkət keçmişə aid olduqda,* **must** *modal felindən sonra məsdər bitmiş formada işlədilir; He must have made a mistake Güman ki/Ehtimal ki, o səhv edib;* 3) *Şərt budaq cümlələrində qeyri-real şərti bildirmək üçün işlədilir. Bu halda da məsdər bitmiş formada işlədilir; If he had looked, he must have seen the lights of the approaching train O, baxmış olsaydı, yaxınlaşmaqda olan qatarın işığını görərdi (görmüş olardı)*

**must** [mʌst] *v* II kiflənmək, kif basmaq

**mustache** [ˈməsta:ʃ] *n* = **moustache**

**mustachio** [məsˈta:ʃou] *n fr.* = **moustache**

**mustang** [ˈmʌstæŋ] *n zool.* mustanq *(vəhşi at)*

**mustang grape** [ˈmʌstæŋˈgreıp] *n bot.* mustanq *(Texas üzümü)*

**mustard**[1] [ˈmʌstəd] *n* 1. *bot.* xardal *(bitki)*; **wild ~** yabanı xardal; 2. xardal *(süfrəyə verilən)*; **English ~** su ilə qatılmış xardal; **French ~** sirkə ilə qatılmış xardal; 3. xardal rəngi; 4. *amer.* ləzzət verən şey; ağız dadı

**mustard**[2] [ˈmʌstəd] *adj* xardal; **~ seed** xardal toxumu;

◊ **to be as keen as ~** çox enerjili/cəld/çevik olmaq; **to be as keen as ~ about something** bir şeydən həvəslə yapışmaq, bir şeyə həvəslə girişmək

**mustard family** [ˈmʌstədˈfæmılı] *n bot.* xaççiçəklilər fəsiləsi

**mustard gas** [ˈmʌstədˈgæs] *n kim.* 1. iprit qazı *(zəhərləyici maddə)*; 2. xardal qazı

**mustard oil** [ˈmʌstədˈoıl] *n* xardal yağı

**mustard plaster** [ˈmʌstədˈpla:stə<sup>r</sup>] *n* xardal yaxması

**mustard pot** [ˈmʌstədˈpɔt] *n* xardal qabı

**mustee** [ˈmʌsti:] *n* 1. ağ və dərisi rəngli adamdan olan uşaq; 2. qarışıq irqə mənsub olan adam

**musteline** [ˈmʌstıli:n] *n* 1. *zool.* dələ; 2. yumşaq tükləri olan vəhşi heyvan

**muster**[1] [ˈmʌstə<sup>r</sup>] *n* 1. müayinə; yoxlama; adbaad yoxlama; **to make/to take ~** *hərb.* şəxsi heyəti siyahı üzrə adbaad yoxlamaq; 2. toplaşma, yığışma; cəm olma; iştirak etmə; **to ~ for roll-call** siyahı ilə oxunuşda iştirak etmək üçün toplaşmaq; 3. nümunə; **a few ~s of new goods** yeni malların bir neçə nümunəsi

**muster**[2] [ˈmʌstə<sup>r</sup>] *v* 1. toplamaq; cəm etmək, əldə etmək; **to ~ the soldiers** əsgərləri adbaad siyahı ilə yoxlanış üçün toplamaq/bir yerə yığmaq; *It's all the food I could muster Mənim bütün əldə etdiyim/topladığım ərzaq budur*; **to ~ a unit** dəstə yığmaq/toplamaq; **to ~ up all *one's* courage** bütün cürətini toplamaq; **to ~ all *one's* thoughts** bütün fikirlərini cəm etmək/cəmləşdirmək; **to ~ all *one's* strength** bütün gücünü toplamaq; 2. toplaşmaq *(adbaad yoxlanmaq üçün)*; **to ~ for roll-call** adbaad yoxlanılmaq üçün toplaşmaq; 3. olmaq, təxmin edilmək; **a society that ~s a hundred numbers** yüz üzvdən ibarət olan cəmiyyət; 4. xidmətə götürmək *(orduya)*; **to ~ into the service** hərbi xidmətə götürmək/qəbul etmək; **to ~ out of service** xidmətdən azad/tərxis etmək; 5. yoxlamaq; 6. xidmətə yararlı olmaq; **to ~ in** orduya yığmaq/toplamaq

**muster-book** [ˈmʌstəˈbuk] *n* = **muster roll**

**muster-out** [ˈmʌstəraut] *n hərb.* ordudan tərxis etmə

**muster roll** [ˈmʌstərɔ:l] *n* 1. *hərb.* şəxsi heyətin siyahısı; 2. *dən.* yoxlama dəftəri

**mustiness** [ˈmʌstınıs] *n* 1. kəf, ərp, köpük; 2. gerilik, geridə qalma; kütlük, ətalət

**must-list** [ˈmʌstlıst] *n amer.* görüləcək vacib işlərin siyahısı

**mustn't** [ˈmʌsnt] **must not** *birləşməsinin qısa forması*



**musty** [ˈmʌstı] *adj* 1. paslı, kifli, kif/pas atmış; lax, ərpli, köpüklü; pis iyli, üfunətli; **~ books** kif atmış kitablar; **~ eggs** lax/köhnə yumurtalar; **to smell ~** pis iy vermək; **~ room** havası ağır /üfunətli otaq; **to grow ~** kif atmaq, turşumaq; 2. köhnəlmiş; **~ ideas** köhnəlmiş fikirlər

**mutable** [ˈmju:təbl] *adj* 1. dəyişən; tez vaxta dəyişə bilən; qeyri-sabit, sabit olmayan; 2. *fon.* səs dəyişikliyinə məruz qalan

**mutage** [ˈmju:tıdʒ] *n* qıcqırmanın dayanması *(üzüm şirəsi haq.)*

**mutant** [ˈmju:tənt] *adj biol.* mutant *(mutasiya nəticəsində əmələ gələn növ)*

**mutate** [mju:ˈteıt] *v* 1. görünüşünü dəyişmək; görünüş etibarilə dəyişmək; 2. *fon.* sait sürüşməsi *(umlaut)* hadisəsi baş vermək

**mutation** [mju:ˈteıʃn] *n* 1. dəyişiklik; 2. çevrilə bilmə; 3. *biol.* mutasiya *(həyat şəraitinin dəyişməsi təsiri altında orqanizmdə yeni bioloji əlamətin /xassənin əmələ gəlməsi)*

**mutative** [ˈmju:tətıv] *adj* dəyişən, dəyişkən; qeyri-sabit, daimi olmayan

**mutch** [mʌtʃ] *n* ləçək

**mutchkin** [ˈmʌtʃkın] *n* pinta *(İngiltərədə və ABŞ-da 0,56 metrə bərabər maye və dənəvər maddələr üçün ölçü qabı)*

**mute**[1] [mju:t] *adj* 1. lal; oxunmayan; 2. lal-dinməz; sakit, dinc, miskin; səssiz; **~ film** səssiz kino; **~ consonant** oxunmayan samit; **to stand ~ with wonder** təəccübdən lal-dinməz dayanmaq, təəccübdən donub qalmaq; 3. *hüq.* müstəntiqin suallarına cavab verməkdən imtina edən;

◊ **~ as a fish** balıq kimi lal; lal-dinməz; ≅ qəbir kimi lal-dinməz

**mute**[2] [mju:t] *v* musiqi alətinə surdinka *(musiqi alətinin səsini azaltmaq üçün istifadə olunan alət)* geyindirmək, səsini almaq *(xüs. musiqi alətinin)*

**mutely** [ˈmju:tlı] *adv* lal-dinməz, dinmədən, danışmadan, dilsiz, dilsiz-ağızsız, səssiz-səmirsiz

**muteness** [ˈmju:tnıs] *n* lallıq; dinməzlik, dilsizağızsızlıq, səssiz-səmirsizlik

**muticous** [ˈmju:tıkəs] *adj bot.* qılçıqsız, qılçığı olmayan

**mutilate**[1] [ˈmju:tıleıt] *adj* 1. şikəst edilmiş; eybəcər hala salınmış; 2. yayınma, təhrif etmə *(fikir haq.)*

**mutilate**[2] [ˈmju:tıleıt] *v* 1. şikəst etmək, eybəcərləşdirmək, eybəcər hala salmaq; 2. təhrif etmək *(fikri, mətni və s.)*

**mutilation** [ˌmju:tıˈleıʃn] *n* 1. şikəstlik; eybəcərlik; 2. təhrif etmə *(mətni və s.)*

**mutineer** [ˌmju:tıˈnıə<sup>r</sup>] *n* qiyamçı, iğtişaşçı, buntçu

**mutinize, -ise** [ˈmju:tınaız] *v d.d.* qiyam qaldırmaq, iğtişaş törətmək

**mutinous** [ˈmju:tınəs] *adj* qiyamçı, iğtişaşçı, iğtişaşda iştirak edən; **~ sailors** qiyamçı dənizçilər

**mutiny**[1] [ˈmju:tını] *n* qiyam, iğtişaş; **the Indian ~** *tar.* Sipailər qiyamı

**mutiny**[2] [ˈmju:tını] *v* **(against)** qiyam qaldırmaq, iğtişaş törətmək

**mutism** [ˈmju:tızm] *n* 1. lallıq; 2. *tib.* danışıqda ara vermə, kəkələmə

**mutt** [mʌt] *n d.d.* 1. səfeh, kütbeyin, axmaq; boşboğaz; *You poor mutt Ay səfeh, Ay boşboğaz*; 2. *kin.* həyət iti

**mutter**[1] [ˈmʌtə<sup>r</sup>] *n* 1. mızıldama; deyinmə, mırtıldama; dodaqaltı danışma; 2. uzaqdan gələn boğuq göy gurultusu

**mutter**[2] [ˈmʌtə<sup>r</sup>] *v* 1. mızıldamaq; deyinmək, donquldanmaq, hədyan söyləmək/danışmaq; **to ~ to oneself** öz-özünə deyinmək; **to ~ threats at *smb.*** bir kəsin ünvanına hədyanlarla hədə-qorxu gəlmək; **to ~ *smth.* in *one's* sleep** xəlvəti danışmaq, yuxuda danışmaq; **to ~ in *smb.'s* ear** bir kəsin qulağına pıçıldamaq; 2. küt səslə guruldamaq; *Thunder muttered among the hills Dağlarda göy boğuq səslə guruldadı*

**muttering** [ˈmʌtərıŋ] *n* 1. mızıltı, mızıldama; **indistinct ~** anlaşılmaz mızıltı/mızıldama; 2. deyinmə; **hostile ~s** düşmənçilik dedi-qoduları

**mutton**[1] [ˈmʌtn] *n* 1. qoyun əti; **roast ~** qızardılmış qoyun əti; **leg of ~** qoyun budu; 2. *məc. d.d.* qoyun *(gic, səfeh adam)*; 3. *kob.* fahişə, qəhbə;

◊ **as dead as ~** həyat əlaməti olmayan, ölü; *This treaty is as dead as mutton Bu müqavilə tamamilə öz qüvvəsini itirmişdir*; **~ dressed as lamb** eşşəyə palan yaraşan kimi; **to return to *one's* ~s** yenidən söhbətin məğzinə qayıtmaq

**mutton**[2] [ˈmʌtn] *adj* qoyun; **~ fat** qoyun yağı; **~ chop** qoyun ətindən kotlet

**mutton-chop** [ˈmʌtnˈtʃɔp] *n* 1. döymə qoyun əti; 2. kiçik bakenbard; **~ whiskers** qısa/kiçik bakenbard

**mutton-ham** [ˈmʌtnˈhæm] *n* hisdə qurudulmuş qoyun budu

**mutton-head** [ˈmʌtnhed] *n d.d.* "qoyun"; kütbeyin, korazehin, sarsaq, gic, səfeh

**muttony** [ˈmʌtənı] *adj* qoyun ətinə bənzəyən; qoyun əti kimi

**mutual** [ˈmju:tjuəl] *adj* 1. qarşılıqlı; ikitərəfli; **~ aid** qarşılıqlı yardım; **~ relations** ikitərəfli/qarşılıqlı münasibətlər; **~ hate** qarşılıqlı nifrət; **~ attraction** qarşılıqlı cəzb etmə; **~ admiration society** bir-birini tərifləyən cəmiyyət; **~ benefit** qarşılıqlı fayda/səmərə; **~ exchange of fire** *hərb.* atışma; 2. *d.d.* ümumi; birgə; **~ friend** ümumi dost; **to state/express ~ opinion** ümumi rəy bildirmək; **~ wall** ümumi divar; 3. müvafiq; *They took their mutual arms Onlar özlərinə aid olan silahları götürdülər*

**mutuality** [ˌmju:tjuˈælıtı] *n* 1. qarşılıqlılıq; qarşılıqlı asılılıq; 2. bir-birinə köməkdarlıq /yardım

**mutually** [ˈmju:tjuəlı] *adv* qarşılıqlı şəkildə/surətdə; ikitərəfli olaraq

**mutuum** [ˈmju:tjuəm] *n hüq. arx.* eyni formalı mal mübadiləsi *(firmalar arasında)*

**muzz** [mʌz] *v* **1.** **(over)** *d.d.* əzbərləmək; əzbər öyrənmək; **2.** başı xarab etmək, zəhlə tökmək; **3.** içirtmək, içirdib keflendirmək
**muzzily** [ˈmʌzılı] *adv* dumanlı, qarışıq, dolaşıq
**muzzle¹** [ˈmʌzl] *n* **1.** sifətin quruluşu; **2.** ağızlıq *(itlərdə)*; **3.** *hərb.* ağız *(topda, tüfəngdə)*; **4.** əleyhqaz
**muzzle²** [ˈmʌzl] *v* I **1.** ağızlıq taxmaq/geyindirmək; **2.** ağzını yummaq; susdurmaq; **3.** iy/qoxu götürmək *(heyvan haq.)*; **4.** *dən.* yelkəni yığışdırmaq
**muzzle** [ˈmʌzl] *v* II **1.** = **muzz** *(2-ci mənada)*; **2.** çox içmək, lül-qəmbər olmaq
**muzzle-loader** [ˈmʌzl.loudəʳ] *n* lülədən doldurulan tüfəng/top
**muzzle-loading** [ˈmʌzl.loudıŋ] *adj* topu/tüfəngi lülədən dolduran; ~ **weapon** lüləsindən doldurulan silah
**muzzle-sight** [ˈmʌzlsaıt] *n* *hərb.* tüfəngdə nişan alınan yer, arpacıq *(tüfəng qaravulu)*
**muzzy** [ˈmʌzı] *adj d.d.* **1.** yolunu azmış; **2.** sərxoş; ağlını itirmiş; kefli; **3.** dumanlı; tutqun *(konturlar haq.)*; **4.** tutqun, buludlu *(hava haq.)*
**my** [maı] *poss. pron* mənim; *Where is my hat? Mənim şlyapam haradadır?; This dictionary is my own Bu lüğət mənim özümündür; My boy Oğlum mənim; My dear Əzizim; My lord Aman allah*
**myalgia** [maıˈældʒıə] *n tib.* mialgiya *(əzələ ağrısı)*
**mycetology** [.maısıˈtɔlədʒı] = **mycology**
**mycologist** [maıˈkɔlədʒıst] *n* mikoloq; mikologiya mütəxəssisi
**mycology** [maıˈkɔlədʒı] *n* mikologiya *(botanikanın göbələklər bəhsi)*
**myocarditis** [.maıɔka:ˈdaıtıs] *n tib.* miokardit *(miokardın iltihabı)*
**myology** [maıˈɔlədʒı] *n* miologiya *(təsviri anatomiyanın əzələlər bəhsi)*
**myria** [ˈmırıə] *mürəkkəb sözlərin tərkib hissəsi olaraq aşağıdakı mənaları ifadə edir* **1.** on min; **myria**-litre **on min** litr; **myria**-metre **on min** metr; **2.** saysız-hesabsız; çoxlu; **myria-ped** qırxayaq *(çoxayaqlı)*
**myriad¹** [ˈmırıəd] *n* **1.** miriad *(hesaba gəlməyən, saysız-hesabsız miqdar)*; **2.** on min
**myriad²** [ˈmırıəd] *adj* saysız-hesabsız
**myrmidon** [ˈmə:mıdən] *n* **1.** sədaqətli qul; **2.** qulluqçu; qul; ~**s of the law** qanunun qulları, qanuna sədaqətlə əməl edənlər
**myself** [ˈmaıself] *refl. pron* özüm; *I hurt myself Mən özümü əzmişəm; I tired myself out working hard Mən çox işləməkdən özümü əldən salmışam; I am not speaking for myself Mən özüm üçün danışmıram, Mən öz adımdan danışmıram*; **by** ~ özüm-özümə; tək; *I often walk by myself Mən tez-tez tək gəzirəm*;
◊ **to be oneself** özündə olmaq; özünü yaxşı hiss etmək; *I am not quite myself today Bu gün mən heç özümdə deyiləm, Bu gün mən özümü yaxşı hiss etmirəm*

**mysterial** [mısˈtıərıəl] *adj* = **mysterious**
**mysterious** [mısˈtıərıəs] *adj* sehrli, sirli; ~ **crime** sirli cinayət; **in a** ~ **way** anlaşılmaz tərzdə
**mystery** [ˈmıstərı] *n* **1.** sirr; **unsolved** ~ açılmamış sirr; **wrapped in** ~ sirli; başdan-ayağa sirli; **to make a** ~ **of** *smth.* bir şeydən sirr düzəltmək; *It is a mystery to me how he managed to do it Mənim üçün sirdir ki, o bu işin öhdəsindən necə gəldi*; **2.** anlaşılmazlıq, müəmma; sirlilik; *I see no mystery about it Mən burada heç bir sirr görmürəm*; **3.** macəra; detektiv; **a book of** ~ macəra kitabı, detektiv kitab
**mystery man** [ˈmıstərı.mæn] *n* **1.** fokus göstərən, gözbağlayıcı; **2.** şaman, sehrbaz, ovsunçu
**mystic** [ˈmıstık] *adj* **1.** mistik *(sufi ideyaları ilə silahlanmış)*; **2.** sirli, müəmmalı; ~ **teachings** sufi təlimi; ~ **rites and ceremonies** sufi ayin və mərasimləri; **3.** sirli; möcüzəli; ~ **powers** sirli qüvvələr; **4.** *din.* fanatik
**mystical** [ˈmıstıkl] *adj* = **mystic**
**mystically** [ˈmıstıkəlı] *adv* sehrli/müəmmalı şəkildə
**mysticism** [ˈmıstısızm] *n* mistisizm; mistika
**mystification** [.mıstıfıˈkeıʃn] *n* **1.** sirrə/ müəmmaya çevirmə; **2.** aldatma, uydurma
**mystificator** [.mıstıˈfıkeıtəʳ] *n* **1.** sirr yayan; möcüzələr uyduran; **2.** aldadıcı, kələkbaz, hiyləbaz, hiyləgər *(adam)*
**mystify** [ˈmıstıfaı] *v* **1.** müəmma/sirr yaratmaq; yolunu azdırmaq; müəmmaya çevirmək; **2.** sufiləşdirmək; **3.** sirlərlə əhatə etmək; **4.** mənanı ört-basdır etmək; kələfi dolaşdırmaq; **5.** aldatmaq; uydurmaq
**mystique** [ˈmısti:k] *n* **1.** məxfilik; sehrlilik; sirlilik; **feminine** ~ sirli qadın qəlbi; **2.** sehrli/mistik güc
**myth** [mıθ] *n* **1.** mif, əsatir, əfsanə; **2.** mövcud olmayan lakin uydurulmuş şəxs/şey
**mythic** [ˈmıθık] *adj* **1.** mifik; əfsanəvi; yalnız miflərdə/əfsanələrdə mövcud olan şey; ~ **literature** mifik ədəbiyyat; **2.** fantastik; uydurma
**mythical** [ˈmıθıkl] *adj* = **mythic**
**mythically** [ˈmıθıkəlı] *adv* **1.** mifik şəkildə/ tərzdə; **2.** miflərin köməyi ilə
**mythicize** [ˈmıθısaız] *v* **1.** mif yaratmaq; **2.** mistik yolla izah etmək
**mytho-** [ˈmaıθou] *mürəkkəb sözlərin tərkib hissəsi Azərbaycan türkcəsində* **mifo-** *tərkibinə uyğun gəlir:* **mythology** mifologiya *(miflər haq. elm)*
**mythologer** [ˈmıθələdʒəʳ] *n* = **mythologist**
**mythologist** [ˈmıθələdʒıst] *n* mifoloq *(miflər üzrə ixtisasçı alim)*
**mythologize, -ise** [ˈmıθələdʒaız] *v* **1.** mif danışmaq; cəfəng danışmaq; **2.** mifləri izah/ tədqiq etmək; **3.** mifə çevirmək
**mythology** [mıˈθɔlədʒı] *n* **1.** mifologiya *(miflər haq. elm)*; **2.** miflərin tədqiqi haqqında təlim; **3.** *arx.* alleqoriya



# Nn

**N, n** [en] *n (pl* **N's, n's** [enz]) **1.** ingilis əlifbasının 14-cü hərfi; *"Nick" begins with (an) N "Nik" sözü N hərfi ilə başlanır;* **2.** *riyaz.* qeyri-müəyyən vahid; **3.** *şəxs və ya yer adlarını məxfi saxlamaq üçün işlədilir;* **Mr. N** cənab N; **military unit N** N hərbi hissəsi
**N** [en] **north(ern)** *sözünün qısaldılmış forması;* ~ **California** Şimali Kaliforniya
**n** [en] **noun** *sözünün qısaldılmış forması*
**nab** [næb] *v* **(-bb-)** *d.d.* **1.** tutmaq, həbs etmək, yaxalamaq, cinayət başında yaxalamaq; *He was nabbed by the police for stealing the money O, pulu oğurladığı üçün polis tərəfindən həbs edildi;* **2.** oğurlamaq, çırpışdırmaq; *Who's nabbed my pen? Mənim qələmimi kim çırpışdırıb?*
**nabob** [ˈneıbɔb] *n* **1.** naib, nüvvab *(Hindistanda varlı, zadəgan)*; **2.** *məc.* Hindistanda varlanmış Avropalı; **3.** *d.d.* pul kisəsi; maqnat; **Wall Street** ~**s** Uol Strit maqnatları
**nacelle** [nəˈsel] *n av.* dirijablın kayutası; təyyarənin kabinəsi
**nacre** [ˈneıkəʳ] *n* **1.** sədəf; **2.** sədəf və ya mirvari çanağı
**nacred** [ˈneıkəd] *adj* **1.** sədəf düzülmüş, sədəflə işlənmiş / bəzədilmiş; **2.** sədəf kimi rəng verən / bərq vuran; rəngdən-rəngə çalan, bərq vuran, əlvan
**nacreous** [ˈneıkrıəs] *adj* sədəf, sədəfi; sədəfdən qayrılmış, sədəf kimi, sədəfəoxşar
**nacrous** [ˈneıkrəs] *adj* = **nacreous**
**nadir** [ˈneıdıəʳ] *n* **1.** *astr.* nadir *(şaquli xəttin üfüq altında göy sferası ilə kəsişdiyi nöqtə)*; **2.** *məc.* ən aşağı səviyyə, son hədd; **the** ~ **of wickedness** qəddarlığın son həddi; **the** ~ **of progress** tərəqqinin tənəzzülü; **the** ~ **of hopes** ümidlərin puça / boşa çıxması; *Company losses reached their nadir in 1992 Şirkətin itkisi 1992-ci ildə son həddə çatdı*
**naevoid** [ˈni:vɔıd] *adj* anadangəlmə *(xal haq.)*
**naevus** [ˈni:vəs] *n (pl* **naevi***)* nevus *(anadangəlmə xal)*
**nag¹** [næg] *n* I yaşlı at; yabı; poni *(kiçikboylu at cinsi)*
**nag** [næg] *n* **II 1.** deyinmə, donquldanma, mırıldanma; öcəşmə, bəhanə, qərəz, yersiz irad; **2.** *d.d.* deyingən/daim donquldanan / mızı arvad
**nag²** [næg] *v* **(-gg-) 1.** bəhanə axtarmaq, yersiz öcəşmək/irad tutmaq, həmişə tənqid etmək; **2.** *d.d.* deyinmək, söylənmək, donquldanmaq, mırtıldamaq; zəhlə tökmək; cana/təngə gətirmək; *Don't nag at me! Zəhləmi tökmə/tökməyin!; The woman nagged him all day long Qadın bütün günü onun zəhləsini töküdü; The problem had been nagging (at) me for weeks Problem həftələrlə məni təngə /cana gətirmişdi*
**nagger** [ˈnægəʳ] *n* **1.** hər şeyə irad tutan, hər şeydən əmma çıxaran, bəhanəçi; **2.** deyingən / daim donquldanan qadın
**nagging¹** [ˈnægıŋ] *n* deyinmə, donquldanma, mırıldanma; sataşma, öcəşmə, bəhanə, zəhlə tökmə
**nagging²** [ˈnægıŋ] *adj* **1.** deyingən, daim donquldanan/mırıldanan; ~ **wife** deyingən arvad; **2.** arasıkəsilməyən, sızıldayan *(ağrı haq.)*; daim; ~ **pain** sızıldayan ağrı; ~ **fear** daimi qorxu
**nail¹** [neıl] *n* **1.** dırnaq; **to do** *one's* ~**s** dırnaqlarını manikür etmək; **to clean/to cut** *one's* ~**s** dırnaqlarını kəsmək; **to bite** *one's* ~**s** dırnaqlarını yemək; **2.** mismar, mıx; **to hammer in a** ~ mıxçanı/mıxı çəkiclə çalmaq; **to drive a** ~ **home** mıxı / mıxçanı axıra qədər vurmaq / çalmaq:
◊ **a** ~ **in** *smb.'s* **coffin** bir kəsin ömrünü azaldan/ tezləşdirən *(şey)*; **hard as a** ~ **1)** polad kimi möhkəm; daşürəkli, sərt; **2)** formada olma *(idmançı haq.)*; **to hit the** ~ **on the head** hədəfə düşmək; ≅ ceyranı / quşu gözündən vurmaq; **right as** ~**s 1)** tamamilə doğru; **2)** tam qaydasında; **3)** tamamilə sağlam; *Pay on the nail! Pulu ver / verin, görüm!*
**nail²** [neıl] *adj* dırnaq; ~ **polish /varnish** dırnaq lakı; ~ **file** dırnaq törpüsü; ~ **scissors** dırnaq qayçısı; ~ **brush** dırnaq şotkası
**nail³** [neıl] *v* **1.** mismarlamaq, mıxlamaq, mismar / mıx çalmaq; **to** ~ **a sign to the wall** divara lövhə vurmaq *(mıxla)*; **to** ~ *smth.* **up** bir şeyi mıxlamaq/ mıxcalamaq; **2.** tutmaq, həbs etmək, yaxalamaq; *The police have nailed the thief Polislər oğrunu tutublar/yaxalayıblar;* **3.** cəlb etmək *(diqqəti və s.)*; **4.** *sl.* bir zərbədə vurub yıxmaq *(güllə ilə və s.)*; *He nailed the rabbit with his first shot O, dovşanı birinci gülləsilə vurub yıxdı;* **to** ~ **at -a/-ə** mıxlamaq / mıxcalamaq; **to** ~ **down** vurmaq, qaxmaq, çalmaq *(paya, mıx)*; **to** ~ **together** mıx /mıxça vurub bitişdirmək;
◊ **to** ~ *smb.* **down, to** ~ *smb.* **to the wall** bir kəsi divara dirəmək, bir kəsi küncə sıxmaq; **to** ~ *smb.* **down to his promise** bir kəsi vədini yerinə yetirməyə məcbur etmək; **to** ~ **to the counter** yalanın üstünü açmaq; yalanı aşkara çıxarmaq
**naildrawer** [ˈneıl.drɔ:əʳ] *n tex.* kəlbətin
**nailed-up** [ˈneıldˈʌp] *adj* tələsik / başdansovdu görülmüş; ~ **drama** başdansovdu yazılmış dram
**nailer** [ˈneıləʳ] *n* mıx / mıxça istehsal edən fəhlə, mıx / mıxça / mismar qayıran usta
**nailery** [ˈneılərı] *n* mıx / mıxça / mismar istehsal edən fabrika

**naive** [na:'i:v] *adj (həm də* **naïve)** 1. sadə, sadədil, sadəlövh; üreyiaçıq; ~ **people** sadədil/sadəlövh adamlar; **a ~ person** sadə/ sadədil/sadəlövh adam; **a ~ question** sadə /sadəlövh sual; **to be politically ~** siyasətdə sadə/sadədil olmaq; *It's naive to believe he'll do what he says Onun dediyini edəcəyinə inanmaq sadəlövhlükdür;* 2. təbii, məsum; **a ~ child** məsum uşaq

**naively** [na'i:vlı] *adv* sadəlövhlüklə, sadədilliklə, sadəlövhcəsinə, sadəlövh bir tərzdə; **to speak ~** sadəlövhcəsinə danışmaq

**naivety** [na:'i:vtı] *n* 1. sadəlik, sadəlövhlük, sadədillik, üreyitəmizlik; 2. təbiilik, məsumluq

**naked** ['neıkıd] *adj* 1. çılpaq, lüt, açıq, üryan; **a ~ child** çılpaq/lüt/üryan uşaq; ~ **body** çılpaq/lüt/üryan bədən; **completely ~** tamam çılpaq; *She stood there completely naked O, orada tamam çılpaq dayanmışdı;* ~ **shoulders** açıq / üryan çiyinlər; 2. sıyrılmış, qınından çıxarılmış; ~ **sword** sıyrılmış / qınından çıxarılmış qılınc; 3. çılpaq, bitkisiz; ~ **trees** yarpaqsız ağaclar; ~ **hills** çılpaq/bitkisiz təpələr / dağlar; 4. boş, döşənməmiş; **a ~ room** boş/döşənməmiş otaq; 5. açıq, açıq-aydın, çılpaq; ~ **truth** açıq / açıq-aydın həqiqət, çılpaq həqiqət; ~ **facts** çılpaq faktlar; ~ **nerve** üstü açıq əsəb; **to fight with ~ fists** əlcəksiz vuruşmaq; **to go about ~** çılpaq /lüt gəzmək; 6. əsassız, sübutsuz, dəlilsiz; ~ **promise** əsassız/boş vəd; ~ **assertion** dəlilsiz /əsassız /sübutsuz müddəa;

◊ **with the ~ eye** adi gözlə; **as ~ as my mother bore me** çıl-çılpaq, lüt-üryan, lüt anadangəlmə

**nakedly** ['neıkıdlı] *adv* açıqlığı / çılpaqlığı ilə, açıq-açığına, açıqca

**nakedness** ['neıkıdnıs] *n* lütlük, çılpaqlıq, üryanlıq; səfalət; ~ **and hunger in the poor village** kasıb kənddə səfalət və aclıq

**namby-pamby**[1] ['næmbı'pæmbı] *n* 1. naz, nazqəmzə, şivə satma, işvə; ədabazlıq; 2. həssaslıq, nazikürəklik, incəqəlblik

**namby-pamby**[2] ['næmbı'pæmbı] *adj* 1. nazlı, nazlıqəmzəli, əzilib-büzülən, ədabaz, əda satan, ədalı; 2. həssas, nazikürəkli, incəqəlbli; sentimental

**name**[1] [neım] *n* 1. ad *(həm də* **Christian ~**; *amer.* **first ~**); *My name is Tom Mənim adım Tomdur; What is your name? Sənin / Sizin adın / adınız nədir?; Write your name and address here, please Zəhmət olmasa, adını / adınızı və ünvanını / ünvanınızı bura yaz /yazın; Do you know the name of this flower Sən / Siz bu çiçəyin adını bilirsənmi / bilirsinizmi?;* **by ~** ad ilə, adbaad; adlı; *The teacher knows all the pupils by name Müəllim şagirdlərin hamısını adbaad tanıyır; I only know her by name Mən onu ancaq adı ilə tanıyıram (yəni adını eşitmişəm, özünü görməmişəm);* **a girl, Anna by ~** Anna adlı qız; 2. şərəf, şöhrət, yaxşı / pis ad; **to make a good ~ for oneself** yaxşı ad qazanmaq; şöhrət qazanmaq; **to get / to win oneself a ~** məşhurlaşmaq, ad qazanmaq; **to perpetuate *one's* ~** özünə əbədilik / ölməzlik qazanmaq; **to have a ~ for honesty/for generosity** düzlükdə / əliaçıqlıqda ad qazanmaq; *She made a name for herself / made her name as a writer of children's fiction O, uşaq yazıçısı kimi şöhrət qazandı;* 3. *pl* söyüş; **to call *smb.* ~s** bir kəsi söymək, bir kəsin abrını tökmək; 4. nəsil; **the last of his ~** onun nəslindən axırıncı/sonuncu; **an illustrious ~** tanınmış/adlı-sanlı / məşhur nəsil; 5. şəxsiyyət; tanınmış/məşhur adam; **the great ~s of history** tarixi şəxsiyyətlər; **the greatest ~ in science** elmdə ən məşhur şəxsiyyət / alim; 6. *qram.* isim; **proper ~** xüsusi isim; **common ~** ümumi isim;

◊ **in God's ~!** Allah xatirinə; **to give *one's* ~ to *smth.*** öz adını bir şeyə vermək; *Charles Macintosh gave his name to a type of raincoat Çarlz Makintoş öz adını plaşa/yağmurluğa verdi*

**name**[2] [neım] *v* 1. adlandırmaq, ad vermək; **to ~ a child John** uşağa Con adı qoymaq; **to ~ after/from**, *amer.* **for** şərəfinə adlandırmaq; *The child was named after his father Uşağa atasının adını qoydular;* 2. adını demək, adbaad saymaq/sadalamaq; **to ~ all the flowers in the garden** bağda olan bütün çiçəklərin adını demək; **to ~ the States of the Union** ABŞ-ın tərkibinə daxil olan bütün ştatların adını demək; 3. təyin / müəyyən etmək; **to ~ the day** toy gününü təyin etmək; **to ~ *one's* price** qiymətini demək; 4. təyin etmək, qoymaq *(vəzifəyə); He has been named consul Onu konsul təyin etdilər;*

◊ **not to be ~d on / in the same day** heç bir müqayisə ola bilməz; *He is not to be named on the same day with his brother Onunla qardaşı arasında heç bir müqayisə ola bilməz*

**name-day** ['neımdeı] *n* ad qoyulan gün

**nameless** ['neımlıs] *adj* 1. adsız, adı olmayan, naməlum; **a ~ village** adsız/naməlum kənd; **a ~ grave** adsız / naməlum qəbir; 2. anonim, adı çəkilməyən / deyilməyən; **a rogue who shall be ~** adını çəkmədiyimiz fırıldaqçı/dələduz; 3. aztanınan, məlum/məşhur olmayan, tanınmayan; 4. təsvir edilə bilməyən, təsvirəgəlməz; **a ~ longing** təsvirəgəlməz arzu; 5. qeyri-qanuni/kəbinsiz doğulmuş; **a ~ child** kəbinsiz doğulmuş uşaq, bic

**namely** ['neımlı] *adj* yəni, daha doğrusu; *Only one boy was late, namely Scott Ancaq bir oğlan gecikmişdi, yəni Skot; Arabic is written in the opposite direction to English, namely from right to left Ərəbcə ingilis dilindən fərqli olaraq əks istiqamətdə yazılır, daha doğrusu, sağdan sola*

**name-plate** ['neımpleıt] *n* üstünə soyadı yazılmış lövhəcik *(qapıların üstünə vurulan)*

**namesake** ['neımseık] *n* adaş; *She's my namesake but we're not related O mənim adaşımdır, lakin biz qohum deyilik; He's his grandfather's namesake O, babasının adaşıdır*



**name-study** ['neım͵stʌdı] *n dilç.* onomastika *(dilçiliyin xüsusi isimləri tədqiq edən hissəsi)*

**nanny** ['nænı] *n* 1. dayə, mürəbbiyə; 2. *uş. dili* nənəcik, nənəciyim

**nanny-goat** ['nænıgout] *n d.d.* dişi keçi

**nap**[1] [næp] *n* **I** qısa müddətli gündüz yuxusu, mürgü *(xüs. nahardan sonra);* **to have / to take a quick ~ after lunch** günorta yeməyindən sonra qısa müddətə yatmaq, mürgüləmək; **to steal a ~** oğrun-oğrun/xəlvəti/gizlincə mürgüləmək

**nap** [næp] *n* **II** 1. *toxuc.* xov; narın tük; 2. xovlu parça; 3. zərif tük *(şaftalıda və s.)*

**nap**[2] [næp] *v* **(-pp-) I** mürgüləmək, mürgü döymək, yatmaq *(qısa müddətə)*

**nap** [næp] *v* **(-pp-) II** *toxuc.* xovlamaq, xov vermək

**napalm** ['neıpa:m] *n* napalm *(yandırıcı bombalar, odsaçan silahlar üçün içində qatı benzin olan qatışıq)*

**nape** [neıp] *n* peysər, boyun ardı, ənsə *(həm də* **~ of the neck)**

**napkin** ['næpkın] *n* 1. salfet, xörək dəsmalı, əlsilən; 2. qundaq, bələk, əski; 3. balaca məhrəba / dəsmal

**napkin-ring** ['næpkınrıŋ] *n* salfetka taxmaq üçün halqa

**napless** ['næplıs] *adj toxuc.* xovsuz, sığallı *(parça haq.)*

**nappy**[1] ['næpı] *n* qundaq, bələk; **to change the baby's ~** körpənin bələyini dəyişmək; *I've changed the baby's nappy Mən körpənin bələyini dəyişmişəm*

**nappy**[2] ['næpı] *adj toxuc.* xovlu, tüklü *(parça haq.)*

**narcism** ['na:sızm] *n* **= narcissism**

**narcissism** [na:'sısızm] *n* özünü bəyənmə, özünün özündən xoşu gəlmə, özündən bədgüman olma; özünə vurulma, özünü sevmə, özünə vurğunluq

**narcissist** [na:'sısıst] *n* özünəvurğun / özünüsevən adam

**narcissistic** [͵na:sə'sıstık] *adj* özünüsevən, özünəvurğun

**narcissus** [na:'sısəs] *n* 1. *bot.* nərgizgülü; 2. *məc.* öz-özünə vurulmuş / aşiq olmuş adam

**narcomania** ['na:kəmeınjə] *n tib.* narkomaniya *(narkotiklərə mübtəla olma)*

**narcomaniac** [͵na:kou'meınıæk] *n* narkoman *(narkotiklərə mübtəla olan adam)*

**narcosis** [na:'kousıs] *n (pl -ses)* narkoz

**narcotherapy** [͵na:kou'θerəpı] *n tib.* yatırmaqla müalicə

**narcotic**[1] [na:'kɔtık] *n* 1. narkotik maddə; **~s** narkotik maddələr / dərmanlar; 2. **= narcomaniac**

**narcotic**[2] [na:'kɔtık] *adj* 1. narkotik; **~ drugs** narkotik dərmanlar; 2. *məc.* yuxugətirən, yuxutörədən; sakitləşdirici; **~ lectures** yuxugətirən mühazirələr; **a ~ effect** narkotik təsir; **a ~ drink** narkotik içkilər; **~ plants** narkotik bitkilər

**narcotical** [na:'kɔtıkəl] *adj* yuxugətirən, yuxugətirici, yatıran, yatırıcı, yuxuladıcı

**narcotist** ['na:kətıst] *n* narkoman

**narcotization** [͵na:kətaı'zeıʃn] *n tib.* narkozlaşdırma; narkoz vermə, bihuş etmə, huşsuzlaşdırma

**narcotize** ['na:kətaız] *v* narkoz vermək, huşsuzlaşdırmaq, bihuş etmək, yatırmaq

**nark** [na:k] *n sl.* donosçu, xəbərçi, çuğulçu

**narrate** [nə'reıt] *v* danışmaq, nağıl etmək; **to ~ *one's* adventures** öz macəralarını danışmaq / nağıl etmək

**narration** [næ'reıʃn] *n* danışma, nağıl etmə, söyləmə

**narrative**[1] ['nærətıv] *n* 1. hekayə, povest; 2. izah etmə, sadalama *(faktları və s.);* **a ~ of plain facts** faktların sadəcə olaraq sadalanması; 3. nağıl / hekayə / rəvayət etmə; rəvayət, təhkiyə; **personal ~** özü haqqında hekayə / rəvayət

**narrative**[2] ['nærətıv] *adj* 1. hekayə; epik; **~ poem** epik poema; **~ literature** bədii ədəbiyyat, romanlar və hekayələr; **a writer of great ~ power** istedadlı belletrist *(belletrist əsərlər yazan yazıçı);* 2. *arx.* danışqan, çoxdanışan, söhbətcil

**narrator** [næ'reıtə<sup>r</sup>] *n* hekayəçi, nağıl edən /danışan; rəvayətçi, əfsanə /hekayət söyləyən

**narrow**[1] ['nærou] *n* dar /darısqal /ensiz yer *(yolda, dərədə və s.)*

**narrow**[2] ['nærou] *adj (-er; -est)* 1. dar, ensiz; **a ~ bed / bridge /channel /path/window** ensiz çarpayı / körpü / kanal / cığır / pəncərə; *The coat was narrow for his shoulder Pencək onun çiyinlərinə dar gəlirdi; The gate is too narrow for a car Maşının keçməsi üçün darvaza çox dardır / ensizdir;* **a ~ circle of friends** dostların dar əhatəsində; **~ gauge** *d.y.* ensiz / dar dəmir yolu; 2. məhdud, məhdudlaşdırılmış, çətin; **~ circumstances** məhdud /çətin şərait; **~ choice** məhdud seçim; **within ~ bounds** məhdud çərçivədə; *The secret is known only to a narrow group of people Sirr məhdud qrup adamlara məlumdur;* 3. dar; **~ mind** dar düşüncə; **in the ~est sense** ən dar mənada; **~ opinions** baxışların məhdudluğu; **~ understanding** dar anlayış; *What does this word mean in its narrowest sense? Bu söz ən dar mənada nə deməkdir?;* 4. azca; bir az; **to be elected by a ~ majority** azca üstünlüklə seçilmək; **to win by a ~ majority** azca üstünlüklə qalib gəlmək; 5. ətraflı, hərtərəfli; dəqiq; **~ examination** ətraflı / dəqiq yoxlama; **~ search** dəqiq / ətraflı axtarış; **to make a ~ inquiry into *smth.*** bir şeyi ətraflı / dəqiq yoxlamaq;

◊ **the ~ house / bed** dar / darısqal ev / çarpayı *(qəbir haq.)*

**narrow**[3] ['nærou] *v* 1. daralmaq, ensizləşmək; *The road / The river narrows here Burada yol / çay darlaşır;* 2. qıymaq *(gözü); He narrowed his eyes O, gözlərini qıydı;* **to ~ *smth.* down** bir

şeyi azaltmaq; *We've narrowed down the list to three possible candidates Biz mümkün olan üç namizədə qədər siyahını azaltdıq*

**narrow-eyed** ['nærou'aıd] *adj* qıyıqgöz, qıyıqgözlü

**narrowing** ['nærouıŋ] *n* daralma, kiçilmə *(xüs. eninə)*

**narrow-leaved** ['nærou'li:vd] *adj bot.* ensizyarpaqlı; ~ **trees** ensizyarpaqlı ağaclar

**narrowly** ['nærouli] *adv* **1.** ətraflı, dəqiq; diqqətlə, diqqətli; **to look ~ at** *smth.* bir şeyə diqqətlə baxmaq; *Watch him narrowly Onu diqqətlə izlə / izləyin;* **to look / to search ~ into an affair** *hüq.* işi diqqətlə / əsaslı tərzdə araşdırmaq / öyrənmək; *The teacher questioned the boy narrowly about why he was late Müəllim oğlandan gecikməsi haqqında ətraflı soruşdu;* **2.** az qala, güclə; *He narrowly escaped drowning O az qala batmışdı; One car went too fast and narrowly missed hitting the other one Bir maşın çox bərk / sürətlə gedirdi və az qaldı, o birisinə dəyə; He narrowly avoided a death O, ölümün pəncəsindən güclə qurtardı*

**narrow-minded** ['nærou'maındıd] *adj* məhdud, dardüşüncəli, darfikirli, dayaz, uzağıgörməyən, səthi *(bilik cəhətdən)*; **a ~ article** səthi /məhdud məqalə; **a ~ man** dardüşüncəli adam; *The narrow-minded articles in this newspaper make me angry Bu qəzetdəki səthi məqalələr məni hirsləndirir*

**narrow-mindedness** ['nærou'maındıdnıs] *n* məhdudluq, dardüşüncəlilik, darfikirlilik, səthilik *(bilik baxımından)*

**narrow-necked** ['nærou'nekt] *adj* darboğaz, darboğazlı *(butulka və s.)*

**narrowness** ['nærounıs] *n* darlıq, məhdudluq; **the ~ of the road** yolun darlığı; **the ~ of mind** fikrin / zəkanın məhdudluğu

**narrow-sighted** ['nærou'saıtıd] *adj* **1.** yaxından görən, uzağı görməyən; **2.** *məc.* fərasətsiz, bəsarətsiz, gələcəyi görməyən

**narrow-souled** ['nærou'sould] *adj* əhəmiyyətsiz, boş, dəyərsiz *(insan haq.)*; ~ **person** əhəmiyyətsiz adam

**narwhal** ['na:wəl] *n zool.* narval *(balinalar dəstəsindən dəniz məməlisi)*

**nasal**[1] ['neızəl] *n* **1.** *fon.* burun səsi; **2.** *anat.* burun sümüyü

**nasal**[2] ['neızəl] *adj* **1.** *anat., tib.* burun; ~ **sounds** burun səsləri; ~ **bone** burun sümüyü; ~ **cavity** burun boşluğu; ~ **septum** burun çəpəri; ~ **cold** zökəm, tumov; ~ **feeding** burun vasitəsilə qidalandırma/qida vermə *(xəstəyə)*; **2.** tın-tın, burunda danışan; ~ **voices** tın-tın səslər

**nascent** ['næsnt] *adj* **1.** yaranan, meydana gələn / gəlməkdə olan, formalaşan; ~ **doubts** meydan gələn / yaranan şübhələr; ~ **anxieties** yaranan əndişə / narahatlıq / təşviş; əldə edilmiş; ~ **freedom** əldə edilmiş azadlıq; **2.** yaranma prosesində olan; ~ **state / condition** ilkin mərhələ / şərait

**nasty** ['na:stı] *adj* **(-ier, -iest) 1.** çox pis, çirkin, iyrənc, mənfur; ürəkbulandırıcı; çirkli; ~ **weather** çox pis / iyrənc hava; *The weather is too nasty today Bu gün hava çox iyrəncdir/pisdir;* **a ~ smell** çox pis/iyrənc/ ürəkbulandırıcı iy; ~ **taste** çox pis/iyrənc /ürəkbulandırıcı dad; **2.** yaramaz, ədəbsiz; həyasız, nalayiq; ~ **words** ədəbsiz / nalayiq sözlər; ~ **stories** ədəbsiz / nalayiq hekayələr; **a ~ man** yaramaz / həyasız adam; *What a nasty man! Nə həyasız / abırsız / yaramaz adamdır!;* **3.** rəhmsiz, amansız, qəddar; *Don't be nasty to your little brother Balaca / Kiçik qardaşına qarşı rəhmsiz / amansız olma / olmayın;* **4.** təhlükəli, hədələyici, təhdidedici; qorxulu; ~ **look** hədələyici / təhdidedici baxış; *He had a nasty look in his eye Onun gözündə hədələyici / təhdidedici baxış vardı;* **to turn ~** hədələmək, hədələyici vəziyyət almaq; *Things look nasty for me İşlər mənim üçün təhlükəli vəziyyət alır;* ~ **illness** qorxulu xəstəlik;
◊ **to leave a ~ taste in the mouth** ağır / pis / xoşagəlməz təəssürat yaratmaq

**nastily** ['na:stılı] *adv* çox pis; yaramazcasına, ədəbsizcəsinə, nalayiq bir tərzdə; həyasızcasına; qəddarcasına

**nastiness** ['na:stınıs] *n* yaramazlıq; çirkinlik, iyrənclik, mənfurluq, həyasızlıq

**nation** [neıʃn] *n* **1.** xalq, millət; **independent ~s** müstəqil xalqlar/millətlər; **peace-loving ~s** sülhsevər xalqlar / millətlər; **smaller ~s** nisbətən kiçik xalqlar; **industrialized ~s** sənayecə inkişaf etmiş xalqlar; *The president spoke on the radio to the nation Prezident radio vasitəsilə xalqa müraciət etdi;* **2.** eyni irqə mənsub və eyni dilə malik insan qrupu; qəbilə; **the Indian ~s in the western United States** Birləşmiş Ştatların qərbindəki hindu qəbilələri

**national**[1] ['næʃnəl] *n* vətəndaş; **American ~s in England** İngiltərədəki Amerika vətəndaşları; **French ~s** fransız vətəndaşları; **enemy ~s** düşmən ölkənin vətəndaşları; **foreign ~s** əcnəbilər, xarici ölkələrin vətəndaşları; *Foreign nationals were asked to leave the country Əcnəbilərin ölkəni tərk etmələri xahiş edildi*

**national**[2] ['næʃnəl] *adj* **1.** milli; ~ **spirit** milli ruh; **a ~ newspaper** milli qəzet; **a ~ holiday** milli bayram; **a ~ bank** milli bank; ~ **minority** milli azlıq; ~ **liberation movement** milli azadlıq hərəkatı; ~ **feelings** milli hisslər; **2.** dövlət; ~ **anthem** dövlət himni; ~ **debt** dövlət borcu; ~ **theatre** dövlət teatrı; ~ **roads** dövlət yolları; ~ **markings** dövlət nişanı *(təyyarənin və s. üstündə)*; **3.** milliyyətçi; **to be ~** millətçi olmaq;
◊ ~ **team** *id.* ölkənin yığma komandası

**nationalism** ['næʃnəlızm] *n* millətçilik; **Scottish ~** Şotlandiya millətçiliyi

**nationalist**[1] ['næʃnəlıst] *n* millətçi; **a Scottish ~** Şotlandiya millətçisi



**nationalist**[2] ['næʃnəlıst] *adj* **1.** millətçi; ~ **party** millətçi partiya; **2.** milli; ~ **leaders** milli-azadlıq hərəkatının rəhbərləri

**nationalistic** [.næʃnə'lıstık] *adj* milli; ~ **favour during the World Cup** Dünya Kuboku uğrunda yarışda milli tərəfkeşlik

**nationality** [.næʃə'nælətı] *n* **1.** millət; milliyyət; **people of the same ~** eyni millətdən olan adamlar; **the different nationalities of the world** dünyanın müxtəlif millətləri; *Different nationalities live in Azerbaijan Azərbaycanda müxtəlif millətlər yaşayır;* **2.** vətəndaşlıq; *She lives in France but has British nationality O, Fransada yaşayır, lakin Britaniya vətəndaşıdır;* **3.** milli xüsusiyyətlər; **4.** milli hisslər, vətənpərvərlik; **5.** milli azadlıq; dövlətçilik

**nationalization** [.næʃnəlaı'zeıʃn] *n* milliləşdirmə; ~ **of industry/railway** sənayenin/ dəmir yolunun milliləşdirilməsi

**nationalise** ['næʃnəlaız] *v* = **nationalize**

**nationalize** ['næʃnəlaız] *v* **1.** milliləşdirmək; dövlət mülkiyyətinə / ümumxalq mülkiyyətinə çevirmək; **to ~ the railways /industry / coalmines,** *etc.* dəmiryollarını / sənayeni / kömürşaxtalarını və s. milliləşdirmək; **2.** vətəndaşlıq qəbul etmək; **3.** milli xüsusiyyət vermək; **4.** millətə çevirmək

**nationalized** ['næʃnəlaızd] *adj* milliləşdirilmiş; **the ~ sector of economy** iqtisadiyyatın milliləşdirilmiş sektoru

**nationally** ['næʃnəlı] *adv* **1.** ümummilli / ümumdövlət baxımından; **2.** bütün ölkədə; ümumxalq tərəfindən, ümumxalqın iştirakı ilə; ~ **known school** bütün ölkədə tanınan məktəb; **to be ~ acclaimed** ümumxalq tərəfindən qəbul edilmək

**national socialism** ['næʃnl'souʃəlızm] *n* nasional-sosializm, nasizm *(Almaniya faşizmi)*

**national socialist** ['næʃənl'souʃəlıst] *n* nasional-sosialist, nasist *(alman faşisti)*

**nationhood** ['neıʃnhud] *n* **1.** dövlətçilik; dövlət statusu *(müstəqil dövlət)*; **2.** milli mövcud olma, millətin statusu

**nationwide** [.neıʃn'waıd] *adj* ümumxalq, ümummilli; bütün ölkədə; ~ **campaign** ölkənin hər yerində aparılan kampaniya; **a ~ search for the criminals** cinayətkarların bütün ölkədə axtarılması; **a ~ broadcast** bütün ölkəyə yayımlanan veriliş

**native**[1] ['neıtıv] *n* **1.** sakin, ...doğulmuş, ...əhli; **a ~ of Italy / France / Germany,** *etc.* İtaliya / Fransa / Almaniya və s. əhli / sakini; **2.** yerli əhali / sakin; *He speaks English like a native O, ingiliscə yerli ingilis kimi danışır; The colonists enslaved the natives Müstəmləkəçilər yerliləri / yerli əhalini qula çevirdilər;* **3.** yerli bitki və ya heyvan; *The kangaroo is a native of Australia Kenquru Avstraliyanın yerli heyvanıdır, Kenqurunun vətəni Avstraliyadır*

**native**[2] ['neıtıv] *adj* **1.** doğma; ~ **language** doğma dil; *English is not my native language İngilis dili mənim doğma dilim deyil;* ~ **land** doğma vətən; *He was never popular in his native Australia O, doğma vətəni Avstraliyada heç vaxt populyar / məşhur olmayıb;* ~ **town** doğma şəhər; *Shamkir is my native town Şəmkir mənim doğma şəhərimdir;* **2.** yerli; ~ **plants** yerli bitkilər; ~ **industry** yerli sənaye; ~ **transport** yerli nəqliyyat; ~ **customs / rituals** yerli adətlər / mərasimlər; **plants ~ to America** Amerika üçün yerli bitkilər *(məs. tütün, kartof)*; **a ~ bird** yerli quş; **a house built of ~ stone** yerli daşdan tikilmiş ev; ~ **farm products** yerli təsərrüfat məhsulları; **3.** anadangəlmə; fitri; ~ **ability** fitri qabiliyyət; **a beauty ~ to her family** onun ailəsinə xas olan gözəllik; **to go ~** yerli əhali kimi yaşamaq; *In Japan we wanted to go native and not to stay in a European hotel Yaponiyada biz yerli əhali kimi yaşamaq istədik və Avropa hotelində qalmadıq;* **4.** təbii; yabanı; ~ **grasses** yabanı otlar; ~ **plants** yabanı bitkilər

**native-born** ['neıtıv'bɔ:n] *adj* yerli, əsl; ~ **American** yerli amerikalı

**nativity** [nə'tıvıtı] *n* **1.** *din.* Milad günü *(xristianlarda əfsanəvi peyğəmbər İsanın anadan olduğu günün bayramı)*; **2.** Nativiti *(İsanın anadan olduğunu göstərən şəkil)*; **3.** doğulma, anadan olma; **the country of** *one's* **~** vətən; **from the hour of my ~** anadan olduğum gündən; **4.** anadan olduğu yer; **5.** horoskop *(ulduz / nücum falı)*

**natrium** ['neıtrıəm] *n kim.* natrium

**natter**[1] ['nætə'] *n* söhbət, gap; **to have a good ~** yaxşı söhbət etmək

**natter**[2] ['nætə'] *v* naqqallıq / boşboğazlıq etmək, laqqırtı vurmaq, çərənləmək; **to ~ away / on about** *smth.* bir şey haqqında laqqırtı vurmaq/çərənləmək; **to ~ about his family** ailəsi haqqında boş-boş danışmaq/çərənləmək; *They nattered (away) all day long and never did any work Onlar bütün günü boş-boş danışdılar / laqqırtı vurdular və heç bir iş görmədilər*

**natty** ['nætı] *adj d.d.* **1.** səliqəli, təmizkar, təmiz; zərif, incə, gözəl, qəşəng; **a ~ suit** qəşəng / gözəl kostyum; **a ~ brief-case** qəşəng / gözəl portfel; **2.** cəld, diribaş, zirək; bacarıqlı; fəndgir, çevik, mahir

**natural**[1] ['nætʃrəl] *n* **1.** ağıldan kəm, gic, sərsəm, idiot; səfeh, axmaq, sarsaq, əbləh *(anadangəlmə)*; *He is quite a natural O, tamamilə gic-dir/sərsəmdir/ idiotdur / axmaqdır;* **2.** yarayan adam; *Bob is a natural for this job Bob elə bil bu iş üçün yaranıb; This job's a natural for Jim Bu iş lap Cim üçün yaranıb;* **3.** *mus.* bekar *(not yazısından əvvəlki diez və bemolun təsirini ləğv və notun əsas mənasını bərpa edən işarə)*

**natural**[2] ['nætʃrəl] *adj* **1.** təbii; xalis, əsl, əsləndə; anadangəlmə, fitri; ~ **forces / phenomena** təbii

qüvvələr / hadisələr; ~ **resources** təbii sərvətlər; ~ **gas** təbii qaz; ~ **harbour** təbii liman; **a flower's ~ beauty** çiçəyin təbii gözəlliyi; ~ **death** təbii ölüm; ~ **selection** təbii seçim; **animals living in their ~ state** təbii şəraitdə yaşayan heyvanlar; ~ **loss / wastage** təbii itki *(qurutma, daşıma və s. vaxtı)*; **the ~ world** bu dünya, dünyəvi həyat; ~ **wool** təbii yun; ~ **flowers** təbii çiçəklər; ~ **teeth** təbii dişlər; ~ **complexion** üzün təbii rəngi *(kosmetikasız)*; 2. təbiət; ~ **science** təbiət elmləri; ~ **historian** təbiətçi; ~ **history** təbiətşünaslıq, təbiət elmləri; 3. adi, normal; təbii; anlaşılan; ~ **mistake** anlaşılan / təbii səhv; *It's natural for a baby to cry if it's hungry Ac olarkən ağlamaq körpə üçün təbiidir / anlaşılandır;* 4. yabanı; ~ **growth** yabanı bitki; 5. anadangəlmə, fitri; ~ **gift / ability** fitri istedad / bacarıq; ~ **linguist** dil öyrənməyə anadangəlmə bacarığı olan adam; *He's a natural linguist O, anadangəlmə dilçidir (yəni dilləri asan öyrənir)*; ~ **orator** fitri / anadangəlmə natiq; ~ **fool** anadangəlmə axmaq / gic / sarsaq; *It's natural for a man to speak İnsan anadangəlmə danışıq qabiliyyətinə malikdir;* 6. kəbinsiz; qeyri-qanuni; **his ~ son** onun kəbinsiz /qeyri-qanuni oğlu; *He's not our natural son, we adopted him when he was three O, bizim qanuni oğlumuz deyil, biz onu üç yaşında oğulluğa götürmüşük*

**naturalizm** [ˈnætʃrəlɪzm] *n fəls.* naturalizm *(təbiət qanunlarını cəmiyyət qanunları ilə eyniləşdirən fəlsəfi cərəyan)*

**naturalist** [ˈnætʃrəlɪst] *n* 1. təbiətçi; 2. *fəls.* naturalist *(naturalizm tərəfdarı)*; 3. zoomağaza sahibi, quş, heyvan satan

**naturalistic** [ˌnætʃrəˈlɪstɪk] *adj* naturalist; **a ~ writer / painter** naturalist yazıçı / rəssam; ~ **philosophy** *fəls.* naturalizm

**naturalisation** [ˌnætʃrəlaɪˈzeɪʃn] *n* = **naturalization**

**naturalization** [ˌnætʃrəlaɪˈzeɪʃn] *n* 1. başqa dövlətin təbəəliyinə keçmə; 2. təbəəliyə götürmə *(əcnəbini)*; 3. iqlimləşdirmə, iqlimləşmə *(heyvan və ya bitkilərin yeni iqlim şəraitinə uyğunlaşdırılması/ uyğunlaşması)*; 4. götürmə, alma *(sözü, adəti və s.)*

**naturalise** [ˈnætʃrəlaɪz] *v* = **naturalize**

**naturalize** [ˈnætʃrəlaɪz] *v* 1. *hüq.* təbəəliyə götürmək, vətəndaşlıq hüququ vermək *(əcnəbiyə)*; *He was naturalized in Japan Onu Yaponiya təbəəliyinə qəbul etdilər, Ona yapon vətəndaşlığı verdilər;* 2. başqa dövlətin təbəəliyini /vətəndaşlığını qəbul etmək; 3. iqlimləşdirmək, yeni iqlimə uyğunlaşdırmaq; yeni mühitə / iqlimə alışdırmaq; 4. yeni iqlimə / mühitə uyğunlaşmaq, yeni iqlimə / mühitə öyrənmək / alışmaq *(heyvan, bitki haq.)*; 5. almaq, qəbul etmək *(sözü, adəti və s.)*, daxil olmaq; *English sporting terms have been naturalized in many languages İngilis idman terminləri bir çox dillərə daxil olub / keçib; This word has become naturalized in Azerbaijani turkish Bu söz Azərbaycan türkcəsinə daxil olub;* 6. təbiət elmləri ilə məşğul olmaq

**naturalised** [ˈnætʃrəlaɪzd] *adj* = **naturalized**

**naturalized** [ˈnætʃrəlaɪzd] *adj* 1. təbəəliyini / vətəndaşlığını qəbul etmiş *(başqa dövlətin)*; **a ~ American who was born in Poland** Polşada doğulmuş amerikan təbəəliyini qəbul etmiş amerikalı; 2. yeni iqlimə öyrədilmiş; yeni şəraitə uyğunlaşdırılmış; ~ **name** əcnəbi adın və ya soyadının yerli əhalinin işlədə biləcəyi tərzdə dəyişdirilmiş ad və ya soyadı *(məs. Yakob-Yaqub, Aleksandr-İsgəndər və s.)*

**naturally** [nætʃrəlɪ] *adv* 1. əlbəttə, şübhəsiz; *Did he win the game? Naturally O, oyunu uddumu? Əlbəttə;* 2. təbiətən; təbii olaraq; *Her cheeks are naturally red Onun yanaqları təbiətən / təbii olaraq qırmızıdır; Her hair curls naturally Onun saçları təbii olaraq burulur; Try to act naturally, even if you're feeling tense Gərginlik hiss etsən / etsəniz də çalış / çalışın ki, təbii hərəkət edəsən / edəsiniz*

**naturalness** [ˈnætʃərəlnɪs] *n* təbiilik

**nature** [neɪtʃəʳ] *n* 1. təbiət; **human ~** insan təbiəti; **the wonders of ~** təbiətin möcüzələri; **the laws of ~** təbiət qanunları; **contrary to the laws of Nature** təbiət qanunlarının əksinə; **man's attempts to control ~** insanın təbiətə nəzarət etmək cəhdləri; 2. xasiyyət, xarakter; **good ~** xoşqəlblilik, həlimlik; **ill ~** kinlilik, qəzəblilik, hirslilik, acıqlılıq; *There is no cruelty in her nature Onun xarakterində qəddarlıq yoxdur;* ~ **of soil** torpağın xüsusiyyəti; 3. növ, qisim, cür, qəbil, çeşid; **goods of such ~** bu növ / cür mallar; **things of this ~** bu cür / növ / qisim şeylər; **events of this ~** bu növ/qism /cür hadisələr; 4. natura, paltarsız, lüt; **to draw from ~** naturadan/ çılpaq / lüt çəkmək;

◊ **in ~** dünyada, kainatda; **to pay *one's* debt to ~** təbiətə borcunu vermək, ölmək

**nature-study** [ˈneɪtʃəʳˌstʌdɪ] *n* təbiətşünaslıq; təbiətin öyrənilməsi

**nature-worship** [ˈneɪtʃəʳwɜːʃɪp] *n* təbiət qüvvələrinə sitayiş

**naught**[1] [nɔːt] *n* 1. *arx.* heç bir şey, heç nə; 2. *riyaz.* sıfır;

◊ **all for ~** boş / əbəs yerə, nahaq, hədər, bihudə; **to come to ~** sıfra / heçə enmək; məhv olmaq; *All his work came to naught when the fire destroyed the house he was building Yanğın onun tikdirdiyi evi məhv etdikdə, onun bütün əməyi hədər(ə) getdi;* **to set a rule at ~** *id.* qaydanı pozmaq *(oyun haq.)*

**naught**[2] [nɔːt] *adj* cüzi, çox kiçik, çox az, çox əhəmiyyətsiz, dəyərsiz; faydasız

**naughtiness** [ˈnɔːtɪnɪs] *n* 1. itaətsizlik, sözə baxmama, itaət etməmə, sözə qulaq asmama *(uşaq haq.)*; dəcəllik, şuluqluq, nadinclik; şıltaqlıq, naz, naz etmə; 2. *d.d.* qüsurluluq, nöqsanlılıq, eyiblilik; qüsur, günahkarlıq



**naughty** [ˈnɔːtɪ] *adj* (-ier; -iest) 1. sözə baxmayan / qulaq asmayan, itaətsiz, itaət etməyən; tərs, ipə-sapa yatmayan; nadinc, dəcəl; şıltaq, şıltaqçı; **a ~ child** nadinc / dəcəl / şıltaq uşaq; *He is the naughtiest child in the class O, sinifdə ən dəcəl / nadinc uşaqdır;* 2. eyibli, biabırçı, ədəbsiz; **a ~ joke** ədəbsiz zarafat; **a ~ word** biabırçı / ədəbsiz söz

**nausea** [ˈnɔːzɪə, ˈnɔːsɪə] *n* 1. ürəkbulanması, öyümə; 2. nifrət; **to fill with ~** nifrət oyatmaq; 3. ürəkbulandırıcı bir şey

**nauseate** [ˈnɔːsɪeɪt] *v* 1. ürəyi bulanmaq; ürəyi bulandırmaq, öyümək, öyütmək; *This food nauseated them Bu yemək onların ürəyini bulandırdı; He was nauseated by the movement of the ship Gəminin hərəkəti onun ürəyini bulandırdı;* 2. nifrət oyatmaq; *It's nauseating to see how he treats his children Onun uşaqları ilə davranmağı adamda nifrət oyadır*

**nauseating** [ˈnɔːsɪeɪtɪŋ] *adj* ürəkbulandıran, ürəkbulandırıcı; ~ **food** ürəkbulandırıcı yemək; **a ~ smell** ürəkbulandırıcı / ürəkbulandıran iy; **a ~ sight** ürəkbulandırıcı mənzərə

**nauseous** [ˈnɔːzɪəs, ˈnɔːsɪəs] *adj* 1. ürəkbulandıran, ürəkbulandırıcı; **a ~ smell** ürəkbulandıran / ürəkbulandırıcı iy; 2. iyrənc, çiyrəndirici; ~ **hypocrisy** iyrənc ikiüzlülük

**nauseously** [ˈnɔːzɪəslɪ, ˈnɔːsɪəslɪ] *adv* 1. ürəkbulandırıcı bir tərzdə; 2. çox pis; **to feel ~** özünü çox pis hiss etmək

**nauseousness** [ˈnɔːzɪəsnɪs, ˈnɔːsɪəsnɪs] *n* ürəkbulandırıcılıq; iyrənclik

**nautical** [ˈnɔːtɪkl] *adj* dəniz; dənizçilik; ~ **mile** dəniz mili *(təxm. 852 metr)*; ~ **navigation** dəniz naviqasiyası; ~ **astronomy** dənizçilik astronomiyası; ~ **almanac** dənizçilik təqvimi; ~ **college** dənizçilik məktəbi / kolleci; ~ **terms** dənizçilik terminləri

**nautics** [ˈnɔːtɪks] *n* 1. dənizçilik işi; 2. su idmanı

**naval** [ˈneɪvl] *adj* hərbi-dəniz; dəniz, donanma; ~ **officer** hərbi-dəniz donanması zabiti; ~ **battle** dəniz döyüşü / vuruşması; ~ **powers** dəniz dövlətləri *(yəni güclü hərbi-dəniz qüvvəsinə malik dövlətlər)*; ~ **forces** hərbi-dəniz qüvvələri; **a ~ uniform** dənizçi forması/geyimi; ~ **supremacy** dənizdə üstünlük; ~ **warfare** dəniz müharibəsi; hərbi-dəniz qüvvələrinin hərbi əməliyyatı; ~ **intelligence** hərbi-dəniz kəşfiyyatı; ~ **law** hərbi-dəniz qanunları; ~ **base** hərbi-dəniz bazası; Naval Academy hərbi-dəniz məktəbi

**navel** [ˈneɪvl] *n anat.* göbək; göbəkbağı

**navel-cord** [ˈneɪvlkɔːd] *n anat.* = **navel-string**

**navel-string** [ˈneɪvlstrɪŋ] *n anat.* göbəkbağı

**navigable** [ˈnævɪgəbl] *adj* 1. gəmi işləyə bilən, gəmiçiliyə yararlı; 2. uçmağa qadir, uça bilən

**navigate** [ˈnævɪgeɪt] *v* 1. üzmək *(gəmidə)*; *He was the first man to navigate the Northern Ocean O, Şimal Okeanına üzən ilk adam idi;* 2. idarə etmək, sürmək *(gəmini və s.)*; **to ~ a ship** gəmi idarə etmək / sürmək; **to ~ a plane** təyyarə idarə etmək / sürmək

**navigation**[1] [ˌnævɪˈgeɪʃn] *n* 1. *dən.* naviqasiya, gəmiçilik, gəmilərin hərəkəti; **in land ~** çay gəmiçiliyi / naviqasiyası; 2. *dən.* gəmiçilik elmi; 3. *av.* təyyarəçilik, təyyarəsürmə sənəti; 4. şturman işi; 5. tuşlama, yönəltmə *(raketi)*

**navigation**[2] [ˌnævɪˈgeɪʃn] *adj* gəmiçilik; ~ **canal** gəmiçilik kanalı; ~ **chart** gəmiçilik / təyyarəçilik xəritəsi; ~ **equipment** gəmiçilik avadanlığı / ləvazimatı; ~ **school** şturman məktəbi; ~ **satellite** süni naviqasiya peyki

**navigator** [ˈnævɪgeɪtəʳ] *n* 1. şturman *(gəmi və ya təyyarə idarə edən şəxs)*; 2. *dən.* naviqator *(naviqasiya mütəxəssisi)*; 3. gəmiçi, dənizçi, dəniz səyyahı; 4. naviqasiya sistemi

**navvy** [ˈnævɪ] *n* 1. yerqazan fəhlə, qazmaçı; 2. ekskavator;

◊ **to work like a ~** ≅ öküz kimi işləmək

**navy**[1] [ˈneɪvɪ] *n* hərbi-dəniz donanması, hərbi-dəniz qüvvələri; **the Royal Navy** Britaniyanın hərbi-dəniz donanması

**navy**[2] [ˈneɪvɪ] *adj:* **Navy Department** *amer.* hərbi-dəniz donanması nazirliyi; **Navy Regulations** hərbi-dəniz nizamnaməsi; ~ **blue** tündmavi, tünd-göy; **a ~ blue dress / suit** tünd-mavi paltar / kostyum

**nay**[1] [neɪ] *n* 1. inkar cavab, yox; 2. əleyhinə səs; *The nays have it Çoxluq əleyhinədir (səsvermə zamanı)*; **yeas and ~s** lehinə və əleyhinə səslər; **to say ~** yox demək, etiraz etmək

**nay**[2] [neɪ] *adv* hətta; *I suspect, nay, I am certain Mən şübhələnirəm, hətta (mən) əminəm; Such a policy is difficult, nay, impossible Belə siyasət aparmaq çətindir, hətta mümkün deyil*

**Nazi** [ˈnaːtsɪ] *n* nasist, alman faşisti

**Nazism** [naːtsɪzm] *n* nasizm, alman faşizmi

**near**[1] [nɪəʳ] *adj (-er, -est)* 1. yaxın; *His house is very near Onun evi çox yaxındadır; Where's the nearest bank? Ən yaxın bank haradadır?;* ~ **relation** yaxın qohum, ailə üzvü; ~ **friends** yaxın / səmimi dostlar, ürək dostları; **the ~est way to the station** vağzala ən yaxın yol; ~ **to *smb.'s* heart** bir kəsin qəlbinə / ürəyinə yaxın; **Near East** Yaxın Şərq; yaxın *(gələcək haq.)*; **the ~ future** yaxın gələcək; 2. süni, xatırladan, oxşayan; ~ **silk** süni ipək; 3. çətinliklə əldə edilən, çətin; zəhmətli, əziyyətli; çox zəhmət tələb edən; ağır; ~ **victory** çətinliklə əldə edilən qələbə; ~ **work** zəhmətli/əziyyətli/ağır iş;

◊ ~ **and dear** doğma, istəkli; ***one's* nearest and dearest** bir kəsin ailəsi; **to spend Christmas with *one's* nearest and dearest** Milad bayramını öz ailəsi və əzizləri ilə keçirmək

**near**[2] [nɪəʳ] *v* **1.** yaxınlaşmaq *(bir şeyə / yerə); The ship was nearing land Gəmi sahilə yaxınlaşırdı;* **2.** sona yaxınlaşmaq, sona çatmaq üzrə olmaq; *They are nearing the end of their exile Onların sürgün müddəti sona çatmaq üzrədir*

**near**[3] [nɪəʳ] *adv* **1.** yaxında, yaxınlıqda; **to stand ~** yaxında durmaq; *Don't go away, stay somewhere near Uzağa getmə / getməyin, yaxında bir yerdə dur / durun;* **to come ~er** yaxınlaşmaq; *Don't approach too nearer Çox yaxınlaşma; We are near related Biz yaxın qohumlarıq; They are near acquainted with the people of the country Onlar ölkənin əhalisini yaxından tanıyırlar;* **to be ~ akin / of a kin** yaxın qohum olmaq; *The harvest season is drawing near Məhsul mövsümü yaxınlaşır;* **2.** demək olar ki; təxminən; *You are near right Demək olar ki, sən / siz haqlısan / haqlısınız; The results are pretty near equal Nəticələr demək olar ki, / təxminən bərabərdir;* **3.** qənaətlə, həddindən artıq qənaətlə; **to live ~** həddindən artıq qənaətlə yaşamaq / dolanmaq

**near**[4] [nɪəʳ] *prep* **1.** yanında, yaxınlığında, yaxınlıqda; böyründə; **~ the door** qapının yanında; *The boy was standing near the door Oğlan qapının yanında dayanmışdı;* **~ the lake** gölün yaxınlığında / yanında; *His family lives near the station Onun ailəsi vağzalın yanında / yaxınlığında yaşayır; Is there a post-office near here? Bu yaxınlaqdı poçt varmı?;* **2.** yaxın; *Put your chair near the fire Stulunu ocağa yaxın qoy; Don't come near me Mənə yaxın gəlmə / gəlməyin; Stand near the window! Pəncərəyə yaxın dur / durun!;* **3.** -a / -ə / -ya / -yə yaxın; **to be ~ the end / the goal** sona / məqsədə yaxın olmaq; *It's near midnight Gecə yarısına yaxındır; It's near dinner-time Nahar vaxtına yaxındır;* **4.** az qala, demək olar ki,...; *My hopes were near fulfilment Mənim arzularım az qala həyata keçsin; The plan came near being realized Demək olar ki, plan həyata keçmişdi*

**nearby**[1] [ˌnɪəˈbaɪ] *adj* yaxınlıqdakı; **a ~ church/ river/town/shop** yaxındakı kilsə/çay/şəhər /mağaza; *The shop nearby sells milk Yaxındakı mağaza süd satır*

**nearby**[2] [ˌnɪəˈbaɪ] *adv* yaxın; **to live ~** yaxın yaşamaq; *These boys live nearby Bu oğlanlar yaxın yaşayırlar*

**nearly** [ˈnɪəlɪ] *adv* **1.** demək olar ki, az qala, təxminən, təqribən; **~ empty / full / finished** demək olar ki, boş / dolu / qurtarmış; *They gave us nearly everything we need Onlar demək olar ki, bizə lazım olan hər şeyi verdilər; It's nearly five o'clock Demək olar ki, saat beşdir; It's nearly time to go Demək olar ki, getmək vaxtıdır; The child very nearly died Uşaq az qala ölmüşdü; I was nearly drowned Mən az qala batmışdım; He's nearly twice as old as I O məndən təxminən / təqribən iki dəfə yaşlıdır;* **2.** bilavasitə; *It concerns me nearly Bu bilavasitə mənə aiddir;* **3.** ciddi, ətraflı, hərtərəfli; **to exam *smth.* ~** bir şeyi ciddi / ətraflı / hərtərəfli yoxlamaq; **to be ~ acquainted with *smth.*** bir şeylə ətraflı/hərtərəfli tanış olmaq; **to be ~ interested in *smth.*** bir şeylə ciddi maraqlanmaq

**nearness** [ˈnɪənɪs] *n* yaxınlıq

**neat**[1] [ni:t] *n (cəmdə dəyişmir) arx.* **1.** öküz; inək; **~'s leather** öküz dərisi; **~'s tongue** inək dili; **2.** *top.i* iribuynuzlu malqara

**neat**[2] [ni:t] *adj* **1.** təmiz, təmizkar; səliqəli; **~ room** təmiz / səliqəli otaq; *He was neat in his dress O, paltar geyməkdə səliqəli idi; She keeps her room neat O, otağını səliqəli saxlayır; Cats are neat animals Pişiklər təmizkar heyvandır;* **2.** aydın və səliqəli; **~ handwriting** aydın və səliqəli əlyazması; **3.** qamətli, boylu-buxunlu, qədd-qamətli *(əndam haq.);* **4.** lakonik, qısa və aydın *(dil və s. haq.);* **a very ~ answer** lakonik / qısa və aydın cavab; **a ~ style** qısa və aydın üslub; **a ~ worker** səliqəli fəhlə; **5.** qarışdırılmamış, təmiz *(spirtli içkilər haq.);* **to drink *one's* whisky ~** viskini qarışdırılmamış içmək

**neatly** [ˈni:tlɪ] *adv* səliqə ilə, səliqə-sahmanla, diqqətlə

**neatness** [ˈni:tnɪs] *n* səliqə, səliqəlilik, təmizlik, təmizkarlıq

**nebula** [ˈnebjulə] *n astr. (pl* **neabulae** [-li:], *yaxud* **nebulas**) **1.** duman kimi görünən ulduz topası; **2.** *tib.* titə, ağ *(göz qişasına düşən ağ ləkə);* **3.** duman, sis

**nebulae** [nebjuli:] **nebula** *sözünün cəm forması*

**nebulosity** [ˌnebjuˈlɔsɪtɪ] *n* **1.** buludluq; **2.** anlaşılmazlıq, qeyri-müəyyənlik, aydın olmama; qeyri-dəqiqlik *(fikir, ifadə haq.),* dağınıqlıq; **the ~ of his ideas** onun fikirlərinin anlaşılmazlığı/qeyri-müəyyənliyi

**nebulous** [ˈnebjuləs] *adj* qarışıq, dumanlı, anlaşılmaz, qeyri-müəyyən; aydın/aşkar olmayan, örtülü; **~ ideas /plans** anlaşılmaz fikirlər / planlar

**nebulousness** [ˈnebjuləsnɪs] *n* anlaşılmazlıq, dolaşıqlıq, qeyri-müəyyənlik *(fikir və s. haq.);* **the ~ of his ideas** onun fikirlərinin anlaşılmazlığı / dolaşıqlığı

**necessaries** [ˈnesɪsərɪz] *n pl* gündəlik tələbat şeyləri/malları, gündəlik lazım olan şeylər; **enough money for the ~ of life** gündəlik ehtiyacları ödəmək üçün lazımi qədər pul

**necessarily** [ˈnesɪsərɪlɪ] *adv* **1.** mütləq, hökmən, əlbət, qəti, qəti surətdə, yəqin; *Tall men are not necessarily strong Hündür adam heç də həmişə güclü olmur;* **2.** labüdən, istər-istəməz; *It must necessarily follow that... Bundan labüdən belə nəticə çıxır ki,...;*

◊ **to be ~ absent** üzürlü səbəbdən iştirak etməmək

**necessary** [ˈnesɪsərɪ] *adj* **1.** gərəkli, lazım, lazımi; zəruri, vacib; *Food is necessary for life Ərzaq həyat üçün vacibdir; It's necessary for me to go there Ora getmək mənim üçün vacibdir;* **to make the ~ laws** lazımi qanunlar hazırlamaq; **2.** labüd, qaçılmaz; *Death is the necessary end of life Ölüm həyatın labüd/qaçılmaz sonudur;* **~ conclusion** labüd/zəruri nəticə; **3.** ayrılmaz tərkib hissəsi; **~ to the scheme** planın ayrılmaz tərkib hissəsi; **4.** məcburi, çarəsiz; məcbur edilmiş; **not a free but a ~ agent** öz arzusu ilə deyil, başqalarının təhriki ilə hərəkət edən şəxs/agent; **5.** şübhəsiz, aşkar, aydın; **~ truth** aşkar həqiqət



**necessitate** [nɪˈsesɪteɪt] *v* **1.** tələb; *Increased traffic necessitated widening the road Nəqliyyatın artması yolun enləşdirilməsini tələb etdi; Increase in population necessitated greater food supply Əhalinin artması ərzaq istehsalını artırmağı tələb etdi;* **2.** məcbur etmək; *I am necessitated to act alone Mən təkbaşına hərəkət etməyə məcbur oldum*

**necessitude** [nɪˈsesɪtjud] *adj* **1.** ehtiyac içində olan, kasıb, yoxsul; **~ public** kasıb / yoxsul əhali; **2.** fəlakətli, müsibətli, qorxulu, ağır, çətin vəziyyətə salınmış *(maddi cəhətdən);* **in ~ circumstance** ehtiyac içində, fəlakətli vəziyyətdə *(maddi cəhətdən);* **3.** naçar qalmış, məcbur olmuş

**necessity** [nɪˈsesətɪ] *n* **1.** lüzum, ehtiyac, hacət; *Is there any necessity for another election Başqa bir seçkiyə ehtiyac / lüzum varmı?; We're faced with the necessity of buying a new car Biz yeni maşın almaq zərurətilə üzləşdik; There is no necessity for rudeness Kobudluğa ehtiyac / lüzum yoxdur;* **2.** labüdlük, qaçılmazlıq; **logical ~** məntiqi labüdlük / qaçılmazlıq; **3.** ən çox lazım olan şeylər; *Food, air and water are necessities for life Ərzaq, hava və su həyat üçün əsas şərtdir;* **4.** ehtiyac, kasıblıq, yoxsulluq; **to be in great ~** böyük ehtiyac içərisində olmaq; **5.** *fəls.* zərurət; **~ and chance** zərurət və təsadüf;

◊ *Necessity knows no law at. söz.* ≅ *Ehtiyac öz qanununu özü yazır*

**neck**[1] [nek] *n* **1.** boyun; **to fall on / upon *smb.'s* ~** bir kəsin boynuna atılmaq; **2.** *məc.* baş, həyat; **to risk *one's* ~** başı ilə riskə getmək; **to save *one's* ~** öz canını qurtarmaq; **3.** boğaz *(butulkada və s.);* **4.** yaxa; yaxalıq; **5.** boyun hissəsi *(heyvanın);* **~ of a shirt** köynəyin boynu; **~ of lamb** quzunun boynu; **6.** küp *(musiqi alətinin yoğun hissəsi);*

◊ **to break the ~ of a job** işin əsas hissəsini görmək; işin belini sındırmaq / qırmaq; **to set *one's* foot on *smb.'s* ~** sıxışdırmaq, sıxıntı / əziyyət vermək, incitmək; bir kəsin heysiyyətinə toxunmaq

**neck**[2] [nek] *v (adətən davamedici zamanda işlədilir)* qucaqlaşaraq öpüşmək; *A boy and a girl were necking on a park bench Bir oğlan və bir qız parkda skamyada qucaqlaşıb öpüşürdülər; She likes necking O qucaqlaşıb öpüşməyi xoşlayır*

**neckcloth** [ˈnekkləθ] *n* **1.** qalstuk, boyuna bağlanan yaylıq; **2.** halqa, dar ağacı

**neckerchief** [ˈnekətʃɪf] *n* boyun yaylığı; şərf, ləçək

**neck-handkerchief** [ˈnekˈhæŋkətʃɪf] *n* = **neckerchief**

**necklace**[1] [ˈneklɪs] *n* boyunbağı, həmail; **a pearl ~** mirvari boyunbağı

**necklace**[2] [ˈneklɪs] *v* sapa düzmək *(muncuğu)*

**neckline** [ˈneklaɪn] *n* kəsik / açıq yer *(paltarda, xüs. qadın paltarında);* **low ~** dərin kəsik / dekolte; **a dress with a low ~** dərin kəsiyi / dekoltesi olan paltar

**necrology** [neˈkrɔlədʒɪ] *n* **1.** nekroloq; **2.** ölənlərin siyahısı

**necromancer** [ˈnekroumænsəʳ] *n* cadugər, sehrbaz, ovsunçu, gözbağlayıcı

**necromancy** [ˈnekroumænsɪ] *n* cadugərlik, sehrbazlıq, ovsunçuluq

**necrophagous** [neˈkrɔfəgəs] *adj* **1.** leşyeyən, leşlə qidalanan; **2.** meyityeyən

**nectar** [ˈnektəʳ] *n* **1.** *əs.* ab-həyat *(yunan əsatirində allahlara əbədi ömür verən içki);* **2.** *bot.* nektar *(bal şirəsi, bitkilərdən sızan şirin şirə); After their long walk the beer tasted like nectar Uzun gəzintidən sonra pivə bal dadırdı;* **3.** meyvə şirəsi

**nectareous** [nekˈteərɪəs] *adj* **1.** *bot.* nektarlı, nektarı olan, ballı, balverən; **2.** şirin; ətirli, ətir saçan; **3.** ilahi, məftunedici, valehedici, çox qəşəng/ gözəl *(dad, iy haq.)*

**nectariferous** [ˌnektəˈrɪfərəs] *adj* nektarlı, balverən, ballı; **~ plants** balverən bitkilər

**nectary** [ˈnektərɪ] *n* *bot.* nektari *(çiçəkli bitkilərdə şirə ayıran orqan)*

**need**[1] [ni:d] *n* **1.** ehtiyac; tələbat, lüzum; **to be /to stand in ~ of *smth.*** bir şeyə ehtiyacı olmaq; **to feel the ~ of *smth.*** bir şeyə ehtiyac hiss etmək; *Are you in need of help? Sənin / Sizin köməyə ehtiyacın / ehtiyacınız varmı?; He felt the need of money Onun pula ehtiyacı vardı; The house is in need of repair Evin təmirə ehtiyacı var; There's no need Ehtiyac yoxdur; Is there any need to hurry / for haste? Tələsməyə ehtiyac/ lüzum varmı?;* **2.** *pl* tələb, tələbat, ehtiyac; **to meet the ~s** tələbatları ödəmək; **daily ~s** gündəlik tələbatlar; **spiritual ~s** mənəvi ehtiyaclar / tələbatlar; **to each according to his ~s** hər kəsə ehtiyacına görə; **3.** kasıblıq, yoxsulluq; dilənçilik; **to live in ~** kasıblıq / yoxsulluq içində yaşamaq; **to be in ~** yoxsul / kasıb olmaq; **4.** çatışmazlıq; **for ~ of** çatışmazlıq ucundan/ucbatından; **5.** fəlakət, müsibət, bədbəxtlik, zaval; çətin vəziyyət; **good at ~** fəlakət / müsibət zamanı əl uzadan/ kömək edən; *They failed him in his need Onlar onu çətin vəziyyətdə atdılar;* **6.** cəhd, səy; **~ of a better education** daha yaxşı təhsil almağa cəhd;

◊ *A friend in need is a friend indeed at. söz. Yaxşı dost yaman gündə tanınar*

**need²** [ni:d] *v (inkar forması: tam* **need not;** *qısa* **needn't)** **I** 1. ehtiyacı olmaq *(bir şeyə); He needs rest Onun istirahətə ehtiyacı var; They need one another Onların bir-birinə ehtiyacı var;* 2. lazım olmaq; *I need to get some sleep Mənə bir az yatmaq lazımdır; The farmers need rain Fermerlərə yağış lazımdır; The shirt needs washing Köynəyi yumaq lazımdır; This needs no saying Bunu demək lazım deyil, Bu öz-özlüyündə aydındır; These facts need no comment Bu faktlara izahat lazım deyil; The letter needs no reply Məktuba cavab vermək lazım deyil; He needs to be careful Ona ehtiyatlı olmaq lazımdır; It needs to be handled carefully Bununla ehtiyatla davranmaq lazımdır; She didn't need to be told twice Ona iki dəfə demək lazım deyil;* 3. layiq olmaq; *She needs a lesson O, dərs almağa layiqdir; What the child needs is a good whipping Bu uşaq yaxşıca şallaqlanmağa layiqdir;* 4. əliaşağı olmaq, ehtiyac içində yaşamaq

**need** [ni:d] *v* **II** *mod.f* 1.*(əsasən sual və inkar cümlələrdə işlədilir; borcluluq və vaciblik bildirir); He need not come early O, tez gəlməyə bilər, Onun tez gəlməsi vacib deyil; You needn't wait Sən / Siz gözləməyə bilərsən / bilərsiniz; Must I go there now? -No, you need not Mən indi ora getməliyəmmi? - Xeyr, ehtiyac yoxdur;* 2. *(perfekt məsdərlə işlənərkən icra edilmiş hərəkətin lazım olmadığını bildirir və təəssüf ifadə edir, Azərbaycan türkcəsinə* **"gərək"** *sözü və* **-dı, -di, -du, -dü** *şəkilçiləri vasitəsilə tərcümə edilir); I need not have done it Gərək mən bunu etməyəydim; I needn't have been in such a hurry Mən gərək belə tələsməyəydim; She needn't have said it O, gərək bunu deməyəydi*

**needful** ['ni:dfl] *adj* 1. lazımlı, lazım/vacib olan; ~ **equipment** lazım/vacib olan avadanlıq; ~ **for the country / for peace / for research** ölkə üçün / sülh üçün / elmi tədqiqat üçün lazım /vacib olan; **as much as** ~ lazım / vacib olan qədər; **to do the** ~ lazım olanı etmək; *Will you do the needful? Sən/Siz lazım olanı edəcəksənmi / edəcəksinizmi?;* 2. kasıb, ehtiyac içində olan; 3. *d.d.* pul, vəsait

**needle¹** ['ni:dl] *n* 1. iynə; **the eye of a** ~ iynənin gözü / deşiyi; **to ply** ***one's*** ~ tikişlə məşğul olmaq; *She threaded the needle expertly O, iynəni usta kimi sapladı;* 2. hörmə iynəsi; hörmə qarmağı; 3. şam ağacının iynəsi *(yarpağı)*; **pine** ~ şam iynələri; **dead pine** ~ quru şam iynələri; 4. əqrəb *(cihazlarda)*; **magnetic** ~ kompasın əqrəbi;

◊ **to look for a ~ in a haystack** ot tayasında iynə axtarmaq, boş / mənasız işlə məşğul olmaq; *Searching for a man in this city is like looking for a needle in a haystack Bu şəhərdə adam axtarmaq ot tayasında iynə axtarmağa bənzəyir*

**needle²** ['ni:dl] *v* 1. tikmək; iynə sancmaq; 2. iynələmək, söz atmaq, sancmaq; **to give** ***smb.*** **the** ~ bir kəsi acılamaq /sancmaq

**needle-case** ['ni:dlkeıs] *n* iynə qabı, iynədan, iynə qutusu, iynəsancan

**needle-point** ['ni:dlpɔınt] *n* iynənin ucu

**needler** ['ni:dləʳ] *n* iynəçi, iynə istehsal edən fəhlə

**needle-shaped** ['nı:dlʃeıpt] *adj* iynəyə bənzər, iynəyə oxşar, iynəvarı, iynə kimi

**needless** ['ni:dlıs] *adj* lazımsız, lazım olmayan, gərəksiz, faydasız, lüzumsuz; ~ **work** faydasız iş; ~ **trouble** lazımsız zəhmət/əziyyət/başağrısı; ~ **cruelty** mənasız / lüzumsuz qəddarlıq

**needlessly** ['ni:dlıslı] *adv* boş / faydasız / lüzumsüz / səbəbsiz yerə; *Let's not argue needlessly; the question is already settled Gəl/ Gəlin faydasız / boş / lüzumsuz yerə mübahisə etməyək; məsələ artıq həll olunub*

**needle-syringe** ['ni:dl.sırındʒ] *n* şpris *(iynə ilə birlikdə)*

**needlewoman** ['ni:dl.wumən] *n (pl* **-women** [-.wımın]) 1. tikişçi /dərzi qadın; 2. tikməçi; *I'm a bad needlewoman Mənim tikişdə əlim yoxdur*

**needlework** ['ni:dlwə:k] *n* 1. əl işi, çəki işi; naxış, çəki; 2. toxuma; toxunmuş şey / məmulat

**needn't** ['ni:dnt] **need not**-*un qısa forması*

**needy** ['ni:dı] *adj* **(-ier, -iest)** ehtiyac içində yaşayan, ehtiyacı olan; yoxsulluq çəkən; **a ~ family** kasıb/yoxsul ailə, yoxsulluq çəkən ailə; **to help the poor and** ~ kasıblara və ehtiyacı olanlara kömək etmək

**neer-do-well** ['neədu:wel] *n* heç nəyə yaramaz, vecsiz, yaramaz *(adam haq.)*

**nefarious** [nı'feərıəs] *adj arx.* iyrənc, çirkin, qəbih, rəzil, alçaq, murdar, mənfur; ~ **deeds** alçaq / mənfur hərəkətlər; ~ **activity** iyrənc / çirkin fəaliyyət

**negate** [nı'geıt] *v* 1. bir şeyin mövcudluğunu və ya həqiqiliyini inkar etmək; rədd etmək; 2. heçə çıxartmaq / endirmək; *His actions often negate our principles Onun hərəkətləri çox vaxt prinsiplərimizi heçə endirir / inkar edir*

**negation** [nı'geıʃn] *n* 1. inkar, inkar etmə; danma; *He made a sign of negation O, inkar əlaməti olaraq başını yırğaladı;* ~ **of** ~ *fəls.* inkarı inkar; 2. mövcudluğunu və ya həqiqiliyini inkar etmə *(bir şeyin)*; **the ~ of God** Allahın mövcudluğunu inkar etmə; 3. heç bir şey, heç nə, boş şey, yalan, fiksiya, uydurma

**negationist** [nı'geıʃnıst] *n* inkar edən/danan *(adam)*; nihilist *(hər şeyi inkar edən adam)*

**negative¹** ['negətıv] *n* 1. inkar cavab; razılaşmama; **to answer in the** ~ inkar cavab vermək; *The answer is in the negative Cavab inkardır;* 2.



rədd etmə; boyun qaçırma, imtina etmə, rədd cavabı; qəbul etməmə; *It was decided in the negative Məsələ qəbul edilmədi;* 3. inkar tərzdə ifadə etmə; *Two negatives make an affirmative Mənfi üstəgəl mənfi müsbət edir;* 4. mənfi surət /qəhrəman; 5. səsvermənin/referendumun mənfi nəticəsi; 6. *qram.* inkar etmə, inkar ədatı; 7. inkar cümlə; 8. *riyaz.* mənfi kəmiyyət/ miqdar; 9. *fiz.* katod *(mənfi elektrod)*, mənfi qütb

**negative²** ['negətıv] *adj* 1. inkar; **a ~ answer** inkar cavab; **a ~ sentence** inkar cümlə; **to give** ***smb.*** **a ~ answer** bir kəsə inkar cavab vermək; 2. mənfi; nəticəsiz; *The experiments proved negative Təcrübə mənfi nəticə verdi; The test for bacteria was negative Bakteriya testinin nəticəsi mənfi oldu (yəni bakteriya tapılmadı);* 3. nihilist, neqativ; ~ **criticism** nihilist öldürücü/ dağıdıcı tənqid

**negative³** ['negətıv] *v* 1. heçə / yoxa çıxarmaq; neytrallaşdırmaq; **to ~ an effect** təsiri neytrallaşdırmaq / yoxa çıxarmaq; 2. rədd etmək; inkar etmək; **to ~ a request** xahişi rədd etmək; **to ~ a hypothesis** fərziyyəni rədd etmək; **to ~ a statement** müddəanı inkar etmək, müddəanın/fikrin doğruluğunu inkar etmək; 3. əleyhinə səsvermə yolu ilə rədd etmək *(qətnaməni, namizədi); The Lords negatived the bill Lordlar palatası qanun layihəsini rədd etdi (yəni qəbul etmədi);* 4. *amer.* veto qoymaq, qadağan/yasaq etmək; təsdiq etməmək

**negatively** ['negətıvlı] *adv* mənfi, çox pis; **to react** ~ mənfi münasibət bəsləmək

**negativity** [.negə'tıvıtı] *n* mənfilik, mənfi münasibət

**neglect¹** [nı'glekt] *n* 1. etinasızlıq, laqeydlik, saymazlıq; etinasızlıq /laqeydlik göstərmə; səliqəsizlik, diqqətsizlik, başısoyuqluq; ~ **of the child by the parents** valideynlərin uşağa etinasızlığı / laqeydliyi / saygısızlığı; ~ **of opportunities** imkanlara etinasızlıq / laqeydlik göstərmə, imkanlardan istifadə etməmə; ~ **while on guard** *hərb.* keşikdə qayda-qanuna saygısızlıq göstərmə; ~ **of official duty** vəzifə borcuna başısoyuq münasibət; 2. baxımsızlıq; nəzarətsizlik, sahibsizlik; **in a state of** ~ baxımsız vəziyyətdə; **a child suffering from** ~ baxımsızlıqdan əziyyət çəkən uşaq, nəzarətsiz / baxımsız qalmış uşaq; 3. unutma, yaddan çıxarma; **to fall into** ~ unutmaq, yaddan çıxarmaq, saygısızlıq / laqeydlik göstərmək

**neglect²** [nı'glekt] *v* 1. məhəl qoymamaq, laqeydlik göstərmək; qeydinə qalmamaq; **to ~ *one's* studies** təhsilinə etinasızlıq / laqeydlik göstərmək; təhsilini atmaq; **to ~ *one's* children** uşaqlarına etinasızlıq / laqeydlik göstərmək, uşaqlarının qeydinə qalmamaq; 2. əldən buraxmaq/ qaçırmaq, əldən vermək; yaddan çıxarmaq, unutmaq; yerinə yetirməmək *(borcu)*; **to ~ to do / doing** ***smth.*** bir şeyi etməyi unutmaq / yaddan çıxartmaq; *Don't neglect writing to your mother Anana / Ananıza məktub yazmağı unutma / unutmayın; I neglected to wind the clock Mən saatı qurmağı unutdum /yaddan çıxartdım;* 3. diqqət verməmək/yetirməmək; etinasızlıq göstərmək; *He neglected his clothes O, geyiminə diqqət yetirmirdi;* **to ~ modern art** müasir incəsənətə əhəmiyyət verməmək/etinasız qalmaq

**neglected** [nı'glektıd] *adj* unudulmuş, yaddan çıxarılmış; nəzarətsiz / başlı-başına buraxılmış; baxımsız, nəzarətsiz; ~ **children** nəzarətsiz / başlı-başına buraxılmış uşaqlar; *The house looked neglected Ev baxımsız görünürdü*

**neglectful** [nı'glektfl] *adj* diqqətsiz; səliqəsiz; ~ **of *one's* appearance** xarici görkəminə diqqət yetirməyən, pinti; ~ **of *one's* family** ailəsinə diqqətsiz olma; ~ **of *one's* responsibilities** öz vəzifəsinə diqqətsiz / saygısız / laqeyd olma

**negligee** ['neglıʒeı] *n fr.* penuar

**negligence** ['neglıdʒəns] *n* 1. diqqətsizlik, saygısızlıq, laqeydlik, saymazlıq, etinasızlıq; başısoyuqluq; *The accident was the result of negligence Hadisə diqqətsizliyin/laqeydliyin nəticəsində baş verdi;* 2. pintilik, səliqəsizlik; ~ **in dress** geyimdə pintilik/səliqəsizlik; 3. ehtiyatsızlıq, laqeydlik, diqqətsizlik, tədbirsizlik; gözdən qaçırma; səhlənkarlıq, başısoyuqluq; **gross** ~ son dərəcə ehtiyatsızlıq/diqqətsizlik; **to be due to the** ~ diqqətsizlik / laqeydlik / ehtiyatsızlıq ucbatından baş vermək; 4. sərbəstlik, təbiilik, sadəlik *(üslub, davranış və s. haq.)*

**negligent** ['neglıdʒənt] *adj* 1.başdansovma; saymaz, saygısız, laqeyd, səhlənkar; ~ **treatment** laqeyd rəftar; ~ **attitude** başdansovma /saygısız/laqeyd münasibət; ~ **air** laqeyd görkəm; ~ **in his work** işinə başdansovdu / laqeyd yanaşan; 2. səliqəsiz, pinti; **to dress with** ~ **grace** səliqəsiz / pinti geyinmək

**negligently** ['neglıdʒəntlı] *adv* başdansovma, necə gəldi, səliqəsiz, diqqətsiz, saymazyana, saygısız, səhlənkarcasına

**negligibility** [.neglıdʒı'bılıtı] *n* cüzilik, son dərəcə azlıq; əhəmiyyətsizlik; miskinlik

**negligible** ['neglıdʒəbl] *adj* cüzi, çox kiçik / az / əhəmiyyətsiz, heç bir dəyəri olmayan; **a ~ quantity** çox az miqdar; **a ~ error** cüzi/əhəmiyyətsiz səhv; **a ~ effect** cüzi təsir; *Losses in trade this year were negligible Bu il ticarətdə itki cüzi / çox az idi; The saving is negligible Qənaət çox azdır / cüzidir*

**negotiable** [nı'gouʃjəbl] *adj* 1. *hüq. mal.* başqasına satıla bilən, başqası tərəfindən alına/satıla bilən; ~ **securities** dövriyyədə olan qiymətli kağız; ~ **document** dövriyyə sənədi; ~ **copy** həqiqi nüsxə *(sazişin)*; 2. keçilə bilən, keçilməsi mümkün olan; gedilə bilən *(yol, yüksəklik haq.)*; *The path was negotiable Cığırla getmək mümkün idi*

**negotiate** [nɪˈgouʃɪeɪt] *v* **1.** danışıqlar aparmaq *(bir kəslə);* şərtləri müzakirə etmək; **to ~ with** *smb.* **for** *smth.* bir kəslə bir şey haqqında danışıq aparmaq; **to ~ for peace / for cease-fire / for truce** sülh / atəşkəs / barışıq haqqında danışıqlar aparmaq; **to ~ with the enemy** düşmənlə danışıqlar aparmaq; **to ~ terms of peace** sülhün şərtləri haqqında razılığa gəlmək; **2.** razılaşmaq, razılığa gəlmək; bağlamaq; almaq *(danışıqlar nəticəsində);* **to ~ a contract** müqavilə / kontrakt bağlamaq; **to ~ a treaty with another nation** başqa dövlətlə müqavilə bağlamaq; almaq; **to ~ a loan** istiqraz almaq; **to ~ a sale** mal satışı üzrə razılığa gəlmək; **3.** *mal.* dövriyyəyə buraxmaq *(vekseli, talonu);* pul almaq *(veksellə, talonla);* **to ~ a bill** veksel satmaq, vekseli dövriyyəyə buraxmaq; **to ~ a cheque 1)** çeklə pul almaq; **2)** çeklə pul ödəmək; **4.** aradan qaldırmaq, dəf etmək *(maneəni, çətinliyi);* **to ~ an obstacle** *hərb.* maneəni dəf etmək; **to ~ a wall** divardan aşmaq / keçmək; *The horse negotiated the fence well At maneəni yaxşı dəf etdi*

**negotiating** [nɪˈgouʃɪeɪtɪŋ] *adj* danışıq; **the ~ table** danışıq stolu; **to ~ table** danışıq stolu arxasında oturmaq; *Both sides still refuse to come to the negotiating table Hər iki tərəf hələ də danışıq stolu arxasında oturmaqdan imtina edir*

**negotiation** [nɪˌgouʃɪˈeɪʃn] *n* **1.** *(Çox vaxt cəmdə işlənir)* danışıq; şərtlərin müzakirəsi; **to enter into ~s with** *smb.* **for** *smth.* bir kəslə bir şey barəsində danışıqlara başlamaq; **to resume ~s** danışıqlara yenidən başlamaq; **to break off ~s** danışıqları dayandırmaq; **by means of ~s** danışıqlar vasitəsilə; **to carry on/to hold ~s** danışıqlar aparmaq; **to fail in** *one's* **~s** danışıqlarda uğursuzluğa uğramaq; **2.** *mal.* vermə, başqasına satma *(alınmış malı),* satma *(vekseli, çeki və s.);* **3.** aradan qaldırma *(maneəni və s.)*

**negotiator** [nɪˈgouʃɪeɪtəʳ] *n* **1.** danışıqlar aparan, danışıqlarda iştirak edən şəxs; nümayəndə üzvü; **chief ~** nümayəndə heyətinin başçısı; **2.** vasitəçi, araçı

**Negress** [ˈni:gres] *n (bəzən təhqiramiz)* zənci qadın / qız

**Negro** [ˈni:grou] *n (pl* **-oes** [-ouz]*) (bəzən təhqiramiz)* zənci

**Negro** [ˈni:grou] *adj* zənci, zəncilərə aid olan; **~ songs** zənci mahnıları; **~ tribes** zənci qəbilələri

**neighbor** [neɪbəʳ] *n* = **neighbour**[1,2]

**neighbour**[1] [neɪbəʳ] *n* qonşu; **next-door ~s** yaxın qonşular; *Turn your radio down, or you'll wake the neighbours Radionun səsini azalt / azaldın, yoxsa qonşuları oyadacaqsan / oyadacaqsınız; They are close / near neighbours of ours Onlar bizim yaxın qonşularımızdır*

**neighbour**[2] [neɪbəʳ] *adj* qonşu, yaxın; **~ states** qonşu dövlətlər

**neighbour**[3] [neɪbəʳ] *v* **1.** **(upon)** həmsərhəd / həmhüdud /yanaşı /yaxınlığında olmaq; *The wood neighbours upon the lake Meşə gölün yaxınlığındadır;* **2.** **(with)** dostluq etmək, mehriban qonşuluq / əlaqəsində olmaq *(bir kəslə)*

**neighbourhood**[1] [ˈneɪbəhud] *n* **1.** qonşuluq, yaxınlıq; **to live in the ~ of London** Londonun yaxınlığında yaşamaq; **2.** rayon, bölgə, məhəllə, kvartal; *We live in a wealthy neighbourhood Biz varlı məhəllədə yaşayırıq;* **a white ~** *amer.* ağlar yaşayan məhəllə/kvartal/rayon; **3.** qonşular; *He was laughed at by the whole neighbours Bütün qonşular ona güldülər/onu ələ saldılar;*

◊ **in the ~ of** təxminən, təqribən; **a sum ~ 500 $** təxminən / təqribən **500 $** məbləğində

**neighbourhood**[2] [ˈneɪbəhud] *adj* məhəlli; yerli; **~ schools** məhəlli məktəblər; **~ papers** yerli qəzetlər; **~ opinion** yerli ictimai fikir

**neighbouring** [ˈneɪbərɪŋ] *adj* qonşu, yanaşı, həmhüdud, həmsərhəd, yaxın; **~ village** qonşu / yaxın kənd; **in the ~ village** qonşu kənddə; **~ countries** qonşu / həmsərhəd ölkələr; **~ town** qonşu şəhər; *This bus services between our town and neighbouring villages Bu avtobus bizim şəhərlə qonşu kəndlər arasında işləyir*

**neighborly** [ˈneɪbəlɪ] *adv amer.* = **neighbourly**

**neighbourliness** [ˈneɪbəlɪnɪs] *n* mehriban qonşuluq əlaqələri, mehribanlıq, səmimilik, xeyirxahlıq, dostcasına əlaqə / münasibət

**neighbourly** [ˈneɪbəlɪ] *adj* dostyana, dostcasına, mehriban; **to speak in a ~ way** dostcasına /dostyana/mehriban danışmaq

**neither**[1] [ˈnaɪðəʳ] *adj* heç bir, heç biri; *Neither answer is correct Heç bir cavab düz deyil; Which is your car? Neither, mine's being repaired Sənin / Sizin maşının / maşınınız hansıdır? Heç biri, mənimki təmirdədir*

**neither**[2] [ˈnaɪðəʳ] *pron* heç kim, heç nə, heç bir; *Neither knows English Heç kim ingiliscə bilmir; Neither of you knows the truth Sizlərdən heç kim / heç biriniz həqiqəti bilmir; I took neither of them Mən onlardan heç birini götürmədim*

**neither**[3] [ˈnaɪðəʳ] *adv* -da, -də, həmçinin da/də, da/də həmçinin; *"I can't speak German well!" "Neither can I" "Mən almanca yaxşı danışa bilmirəm! Mən də"; I haven't been to London before and neither has my brother Mən əvvəllər Londonda olmamışam, həmçinin mənim qardaşım da; "Do you see the plane?" "No". "Neither do I" "Sən/Siz təyyarəni görürsənmi / görürsünüzmü?" "Xeyr". "Mən də"; If you don't go, neither will I Əgər sən / siz getməsən /getməsəniz, mən də getməyəcəm*

**neither ...nor** [naɪðə...nɔ:] *conj* nə... nə; *Neither the television nor the radio works / work properly Nə televizor nə də radio yaxşı işləyir; I saw neither him nor his wife Mən nə onu, nə də onun arvadını gördüm; He has neither brothers no sisters Onun nə qardaşı, nə də bacısı var*



**neo-** [ˈni:ə] *pref. (isimlərin, sifətlərin və bəzən zərflərin əvvəlində işlənir və həmin sözə* **yeni, müasir** *mənası verir)* neo-Fascism neofaşizm *(İkinci dünya müharibəsindən sonra meydana gələn faşizm);* **Neo-Latin** müasir latın dili *(yazılı və şifahi nitqdə işlənən)*

**Neo-Darwinism** [ˈni:ouˈda:rwɪnɪzm] *n* neodarvinizm, yeni darvinizm

**neo-fascist** [ˈni:ouˈfæsɪst] *n* neofaşist

**neologism** [ni:ˈɔlədʒɪzm] *n dilç.* neologizm *(dildə əmələ gəlmiş yeni söz və ya köhnə sözün qazandığı yeni məna); There are many neologisms in computing terminology Kompyüter terminologiyasında çoxlu neologizmlər var*

**nephew** [nefju:, nevju:] *n* **1.** qardaş / bacı oğlu; **2.** arvadın və ya ərin qardaşının / bacısının oğlu və ya qızı; **3.** *arx.* nəvə

**nephritis** [neˈfraɪtɪs] *n tib.* nefrit *(böyrəyin iltihabı)*

**nepotism** [ˈnepətɪzəm] *n* nepotizm, qohumbazlıq, dostbazlıq, proteksiya, himayəçilik, tanışbazlıq; **to achieve promotion through ~** qohumbazlıq/dostbazlıq vasitəsilə irəliləmək/yüksəlmək *(vəzifədə və s.)*

**Neptune** [ˈneptju:n] *n astr.* Neptun *(planet)*

**nerve**[1] [nə:v] *n* **1.** *anat.* əsəb, sinir; **2.** əsəblər, sinirlər; əsəb /sinir sistemi; **iron ~s** dəmir əsəb; **to get on** *smb.'s* **~s** bir kəsin əsəblərinə toxunmaq, bir kəsi əsəbiləşdirmək; *Stop whistling! You're getting on my nerve Fit çalmağı kəs / kəsin! Sən/Siz mənim əsəblərimə toxunursan / toxunursunuz;* **3.** əsəbilik; **to suffer from ~s** əsəbilikdən əziyyət çəkmək; *He doesn't know what nerves are O, əsəbiliyin nə olduğunu bilmir;* **4.** cəsarət, dəyanət, təmkin; **a man of ~** təmkinli/dəyanətli adam; **to lose** *one's* **~** təmkinini/ dəyanətini itirmək; qorxmaq; **5.** *d.d.* həyasızlıq, sırtıqlıq; abırsızlıq, utanmazlıq, ədəbsizlik; *You have a nerve! Nə həyasızsan əə! / sırtıqsan əə!;* **to have the ~ to do** *smth.* *d.d.* bir şeyi həyasızlıqla / sırtıqlıqla etmək, bir şeyi etməyə üzü olmaq / üzü gəlmək; **6.** güc, qüvvə; enerji; **to strain every ~** bütün gücünü / qüvvəsini sərf etmək;

◊ **to be the ~ and soul of** *smth.* bir şeyin beyni və canı olmaq

**nerve**[2] [nə:v] *v* güc/cəsarət/qətiyyət vermək/toplamaq; *I nerved myself to go to the dentist Mən diş həkiminə getmək üçün cəsarətimi topladım; The girl cannot nerve herself to accepting his offer Qız onun təklifini qəbul etməyə özünü məcbur edə bilmir*

**nerveless** [ˈnə:vlɪs] *adj* **1.** *biol.* əsəb sistemi olmayan; **2.** zəif, gücsüz; ölüvay, cansız; **~ hand** gücsüz əl; **~ fingers** gücsüz / zəif barmaqlar; *The knife fell from her nerveless fingers Bıçaq onun gücsüz / zəif barmaqlarından düşdü;* **3.** cəsur, qorxmaz, qorxusuz, dəliqanlı, dəli-dəli; **4.** sakit, soyuqqanlı, əsəbiləşməyən

**nervelessly** [ˈnə:vlɪslɪ] *adv* cəsarətlə, qorxmazcasına, qorxmazyana

**nervous** [ˈnə:vəs] *adj* **1.** *anat.* əsəb, sinir; **~ system** əsəb sistemi; **~ tissue** əsəb /sinir toxuması; **2.** *tib.* əsəb, əsəbi; **a ~ disorder** əsəb pozğunluğu; **~ exhaustion** əsəb yorğunluğu; **to be ~** əsəbiləşmək; əsəbi olmaq; *Don't be nervous! The doctor just wants to help you Əsəbiləşmə! / Əsəbiləşməyin! Həkim ancaq sənə / sizə kömək etmək istəyir;* **a ~ smile** əsəbi təbəssüm; *He is too nervous a person O, çox əsəbi adamdır;* **a ~ disease** əsəb xəstəliyi; **3.** qorxaq, qorxacaq, cəsarətsiz; ürəksiz, ağciyər; əsəbləri zəif; narahat olan, narahatlıq keçirən *(bir şey haq.);* **to feel ~ about future** gələcək haqqında narahatlıq keçirmək; **to feel ~ over** *smb.'s* **absence** bir kəsin olmamasından narahatlıq keçirmək

**nervously** [ˈnə:vəslɪ] *adv* əsəbi halda/tərzdə, əsəbi-əsəbi; *She glanced nervously behind the girl O, qızın arxasınca əsəbi halda baxdı*

**nervousness** [ˈnə:vəsnɪs] *n* **1.** əsəbilik; *He tried to hide his nervousness O, əsəbiliyini gizlətməyə çalışdı;* **2.** qorxaqlıq, ürəksizilk, cəsarətsizlik, ağciyərlik

**nervy** [ˈnə:vɪ] *adj* **1.** *d.d.* əsəbi, həyəcanlı, əndişəli; **2.** *jarq.* özündənrazı, lovğa, özünəgüvənən, özünəqürrələnən, saymaz

**-ness** [nəs] *suff əsasən sifətdən isim düzəltmək üçün işlədilir:* **calm** sakit; **calmness** sakitlik; **bitter** acı; **bitterness** acılıq; **dry** quru; **dryness** quruluq; **blind** kor; **blindness** korluq; **silly** axmaq; **silliness** axmaqlıq və s.

**nest**[1] [nest] *n* **1.** yuva; **bird's ~** quş yuvası; **~ of mice** siçan yuvası; **sparrows' ~** sərçələrin yuvası; **ants' ~** qarışqaların yuvası; **to take a ~** yuva uçurmaq; **2.** koma, ev, doğma yuva; **some poor man's ~** bir kasıb kişinin koması / evi; **3.** **(of)** qumarxana, tiryəkxana, məskən; **~ of robbers** quldurların məskəni; **~ of vice** əxlaqsızlıq məskəni; **4.** dəstə, güruh; yığıncaq, yığnaq; banda; **~ of criminals** cinayətkarlar dəstəsi / bandası

**nest**[2] [nest] *v* **1.** yuva tikmək; *Swallows are nesting in the garage Qaranquşlar qarajda yuva tikirlər; Most birds nest in trees Əksər quşlar ağaclarda yuva tikirlər;* **2.** özünə məkan salmaq; *Pirates nested themselves on the island Quldurlar özlərinə adada məskən saldılar;* **3.** yuva axtarmaq; yuva uçurmaq

**nesting** [ˈnestɪŋ] *n* yuva axtarmaq *(xüs. yumurta götürmək üçün);* **to go ~** yuva axtarmağa getmək *(yumurta götürmək üçün)*

**nestle** [ˈnesl] *v* **1.** **(in, into, among)** yerləşmək; oturmaq, özünə yer eləmək; rahat oturmaq; *They nestled in front of the fire Onlar ocağın qabağında rahat oturdular;* **2.** **(against, to)** qısılmaq, yapışmaq, sıxılmaq; *The child nestled close to its mother Uşaq anasına bərk-bərk qısıldı;* **3.** **(against, in)** gizlətmək, basmaq, soxmaq; *The child*

*nestled his face against / in his mother's shoulder Uşaq üzünü anasının çiyninə basdı;* 4. daldalanmaq, sığınmaq; gizlənmək; **to ~ in the grass** (göy) otun içində gizlənmək; **to ~ among the leaves** yarpaqların arasında gizlənmək

**nestler** ['neslə<sup>r</sup>] *n* = **nestling**

**nestling** ['neslıŋ] *n* quş balası *(hələ tüklənməmiş)*, ətcəbala

**net**[1] [net] *n* **I** 1. tor; **to catch with ~s** torla tutmaq; **tennis ~** tennis toru; **a mosquito ~** ağcaqanad toru; **to kick /to hit the ball into the ~** topu vurub tora salmaq *(futbol oyununda)*; 2. tələ, tor; **to spread** *one's* **~ for** *smb.* bir kəsə tor / tələ qurmaq; **to be caught in a cheat's ~** fırıldaqçının toruna düşmək; 3. *toxuc.* tül *(nazik tor parça)*; 4. hörümçək toru; *The spider weaves his net Hörümçək özünə tor hörür*

**net** [net] *n* **II** 1. *mal.* netto, xalis gəlir; qabsız çəki; 2. saldo, qalıq *(gəlir və çıxar yekunları arasındakı fərq; debet və kredit)*; 3. mahiyyət, məğz, əsas mətləb

**net**[2] [net] *adj* 1. təmiz; netto; **~ weight** xalis / netto çəki; **~ cost** xalis qiymət; **~ income** 1) xalis gəlir; 2) *amer.* gəlir vergisi tutulmalı olan gəlir /mədaxil; **~ load** arva *(malın yığıldığı qabın çəkisi)*; **~ price** son / axırıncı qiymət *(lazım olan güzəştlər çıxıldıqdan sonrakı)*; **~ profit** təmiz qazanc; **~ surplus** xalis / izafi gəlir; 2. ümumi; son; **~ efficiency** faydalı hərəkətin ümumi əmsalı; **~ result** son nəticə

**net**[3] [net] *v* (-tt-) **I** 1. torla tutmaq; cələ/tələ/duzaq vasitəsilə tutmaq; **to ~ fish** torla balıq tutmaq; **to ~ a bird** cələ/tələ ilə quş tutmaq; 2. tor qurmaq; **to ~ a river** çayda tor qurmaq, çaya tor qoymaq; 3. *məc.* tora/ tələyə salmaq, toruna salmaq, ələ keçirmək; **to ~ a rich husband** ələ dövlətli ər keçirmək; toruna dövlətli ər salmaq; *She's netted a rich husband for herself O, ələ dövlətli bir ər keçirib;* 4. əsir etmək /tutmaq *(həm də məc.)*; **to ~ a prisoner of war** müharibədə əsir tutmaq/almaq; **to ~** *smb.'s* **fancy** bir kəsin təxəyyülünü əsir etmək; 5. hörmək; **to ~ a purse** pul kisəsi hörmək; 6. torla örtmək; **to ~ the fruit trees to protect them from birds** quşlardan qorumaq üçün meyvə ağaclarını torla örtmək

**net** [net] *v* **II** 1. *iqt.* təmiz gəlir gətirmək / vermək; *The sale netted the company a fat profit / netted a fat profit for the company Satış kompaniyaya çox böyük yağlı gəlir gətirdi;* 2. *iqt.* təmiz gəlir əldə etmək / götürmək; *He netted 500 $ from the sale O, satışdan 500 $ təmiz gəlir / qazanc götürdü*

**netful** ['netful] *adj* bir tor, tor dolusu; **a ~ fish** bir tor balıq

**nether** ['neðə<sup>r</sup>] *adj arx.* aşağı; **~ lip** aşağı dodaq; *Her nether lip was trembling Onun alt dodağı əsirdi;* **~ garments** kostyumun aşağı hissəsi *(yəni şalvar)*;

◊ **~ world / regions** cəhənnəm

**netting** ['netıŋ] *n* 1. tor; tor-tor material; **windows screened with ~** tor vurulmuş pəncərələr; 2. *tik.* armaturdan hazırlanmış tor; 3. tor hörmə; hörmə *(kruževa və s.)*; 4. torla / tələ ilə / cirə ilə ovlama

**nettle**[1] ['netl] *n bot.* gicitkən;

◊ **to be on the ~** tikan / iynə üstündə oturmaq; **to grasp the ~** çətin işə cəsarətlə girişmək

**nettle**[2] ['netl] *v* 1. gicitkənlə dalamaq; *He nettled himself Onu gicitkən daladı;* 2. hirsləndirmək, acıqlandırmaq, əsəbiləşdirmək; qıcıqlandırmaq; **to ~ a speaker with rude question** natiqi kobud suallarla əsəbiləşdirmək/hirsləndirmək; *My remarks clearly nettled her Mənim iradlarım açıq-aşkar onu əsəbiləşdirdi/ hirsləndirdi*

**network**[1] [netwə:k] *n* 1. şəbəkə; **a railway ~** dəmir yol şəbəkəsi; **Britain's ~** Britaniyanın dəmir yol şəbəkəsi; **the ~ of bloodvessels in the body** bədəndə qan damarlarının şəbəkəsi; **a ~ of underground pipes** yeraltı boruların şəbəkəsi; 2. hörmə, toxuma

**network**[2] ['netwə:k] *v amer.* dəmir yolu çəkmək; *Whole country are networked Dəmir yol şəbəkəsi bütün ölkəni əhatə edir*

**neural** ['njuərəl] *adj anat.* əsəb, sinir, əsəb /sinir sisteminə aid; **~ processes** əsəb prosesləri; **~ canal** onurğa beyni kanalı

**neuralgia** [ˌnjuə'rældʒə] *n tib.* nevralgiya *sinir keçdiyi yerdə törəyən ağrı)*

**neuralgic** [njuə'rældʒık] *adj tib.* əsəbi, nevralgiyadan törəyən, nevralgiya

**neurasthenia** [ˌnjuərəs'θi:njə] *n tib.* nevrasteniya *(sinir sisteminin zəifləməsi nəticəsində əmələ gələn, tez yorulma, əsəbilik, baş ağrısı və s. şəklində təzahür edən əsəb xəstəliyi)*

**neurasthenic** [ˌnjuərəs'θenık] *adj tib.* nevrastenik, əsəbi

**neuritis** [njuə'raıtıs] *n tib.* nevrit *(sinirin iltihabı)*

**neuro-** ['njuərou-] *həm də* **neur-** [nuər-] *əsasən tibbi terminləri olan mürəkkəb sözlərin tərkib hissəsi:* **neurologist** nevropatoloq; **neuropathology** nevropatologiya; **neuroma** nevroma; **neuralgia** nevralgiya və s.

**neurologist** [njuə'rələdʒıst] *n* nevropatoloq

**neurology** [njuə'rələdʒı] *n tib.* nevrologiya *(sinir sistemi və onun xəstəliklərindən bəhs edən elm sahəsi)*

**neuroma** [njuə'roumə] *n (pl* **-ta)** nevroma *(sinir toxumalarından ibarət şiş / törəmə)*

**neuropathist** [njuə'rəpəθıst] *n* nevropatoloq

**neuroses** [njuə'rousı:z] **neurosis** *isminin cəm forması*

**neurosis** [njuə'rousıs] *n (pl* **-ses)** *tib.* nevroz *(əsəb xəstəliyi)*

**neurosurgery** [ˌnjuərou'sə:dʒərı] *n tib.* neyrocərrahlıq, neyrocərrahiyyə

**neuter**[1] [nju:tə<sup>r</sup>] *n* 1. *qram.* orta cins; 2. burulmuş / axtalanmış heyvan; 3. *bot.* cinsiyyətsiz heyvan və ya bitki



**neuter**[2] [nju:tə<sup>r</sup>] *adj* 1. *qram.* orta cinsə aid olan; **a ~ noun** orta cinsə aid olan isim; 2. erkəklik və dişilik əlaməti olmayan *(bitki və heyvanlar haq.)*

**neuter**[3] [nju:tə<sup>r</sup>] *v* axtalamaq, burmaq; *We have our billy-goat neutered Biz erkək keçimizi axtalatdırmışıq / burdurmuşuq*

**neutral**[1] ['nju:trəl] *n* 1. bitərəf dövlət; 2. bitərəf dövlətin vətəndaşı; bitərəf dövlətin gəmisi; 3. neytral vəziyyət

**neutral**[2] ['nju:trəl] *adj* 1. bitərəf; **a ~ country /observer / position** bitərəf ölkə / müşahidəçi / mövqe; **~ nation** bitərəf dövlət; **~ ships / forces/ territory** bitərəf ölkənin gəmiləri / ordusu / ərazisi; **to be ~** bitərəf olmaq; **to remain ~** bitərəf qalmaq; 2.orta, qeyri-müəyyən, aralıq; neytral; **~ attitude** qeyri-müəyyən münasibət; **to be ~ in a quarrel** mübahisədə iştirak etməmək; **~ vowel** *fon.* neytral sait; 3. laqeyd, etinasız; hissiz; **~ in expression** heç nə ifadə etməyən *(sifət haq.)*; 4. qərəzsiz, bitərəf, üz görməyən; **~ opinion** qərəzsiz fikir; 5. qeyri-müəyyən, solğun *(rəng haq.)*; **~ colour** 1) qeyri-müəyyən / solğun rəng; 2) təmiz, çaları olmayan; **~ blue** təmiz / çaları olmayan mavi rəng

**neutralism** ['nju:trəlızm] *n* 1. bitərəflik, neytrallıq; 2. neytralizm, bloklara qoşulmama siyasəti

**neutralist** ['nju:trəlıst] *n* bitərəflik tərəfdarı, bitərəf adam

**neutrality** [nju:'trælıtı] *n* 1. bitərəflik; 2. qərəzsizlik, üz görməzlik; **~ of a judge** hakimin qərəzsizliyi

**neutralisation** [ˌnju:trəlaı'zeıʃn] *n* = **neutralization**

**neutralization** [ˌnju:trəlaı'zeıʃn] *n* bitərəfləşdirmə, neytrallaşdırma; bitərəfləşmə, neytrallaşma

**neutralise** ['nju:trəlaız] *v* = **neutralize**

**neutralize** ['nju:trəlaız] *v* 1. bitərəfləşdirmək, neytrallaşdırmaq; **to ~** *smb.'s* **influence** bir kəsin təsirini neytrallaşdırmaq; **to ~ a state** dövləti neytrallaşdırmaq; 2. heçə endirmək, məhv etmək; **to ~ efforts** səyləri heçə endirmək; *One colour neutralizes another Bir rəng digərini məhv edir*

**never** ['nevə<sup>r</sup>] *adv* 1. heç vaxt / zaman; *I've never seen her Mən onu heç vaxt görməmişəm; Never forget to lock the door at night Gecə qapını bağlamağı heç zaman unutma/ unutmayın;* 2. bir daha; *He never came back O, bir daha geri qayıtmadı;*

◊ *Never mind Zərər yoxdur, Boş şeydir, Buyur! / Buyurun!*

**never-ceasing** ['nevə'si:sıŋ] *adj* arasıkəsilməz, arasıkəsilməyən, tükənməz, tükənməyən, sonsuz, nəhayətsiz, qurtarmaz, qurtarmaq bilməyən, aramsız; **~ noise** arasıkəsilməyən / aramsız səs; **~ rains** arasıkəsilməyən / aramsız / qurtarmaq bilməyən yağışlar

**never-dying** ['nevə'daııŋ] *adj* ölməz, əbədi, əbədiyaşar, həmişəyaşar

**never-ending** ['nevər'endıŋ] *adj* sonsuz, arasıkəsilməyən, arasıkəsilməz; aramsız; **~ watch** aramsız/arasıkəsilməz müşahidə; **~ hate** sonsuz nifrət

**never-fading** ['nevə'feıdıŋ] *adj* soluxmaz, solmaz, solmayan, heç vaxt solmayan

**never-failing** ['nevə'feılıŋ] *adj* həmişəlik, daimi; sadiq, dəyişməz, sabit; **~ friend** sadiq / həmişəlik dost

**nevermore** ['nevə'mɔ:<sup>r</sup>] *adv* artıq heç vaxt, bir daha

**nevertheless**[1] [ˌnevəðə'les] *adv* hər halda, bununla belə; *He did it nevertheless Hər halda / Bununla belə o, bunu etdi*

**nevertheless**[2] [ˌnevəðə'les] *conj* baxmayaraq, hərçənd; bununla belə; hər halda...; *She was very tired, nevertheless she kept working Çox yorğun olmasına baxmayaraq, o, işini davam etdirdi; There was no news; nevertheless she went on hoping Hərçənd heç bir xəbər yox idi, o, ümidini itirmirdi*

**new** [nju:] *adj* (-er, -est) 1. yeni, təzə; **a ~ film/novel /car/book /home /idea /job /teacher,** *etc.* yeni film /roman / maşın/ kitab/ ev/ fikir /iş/ müəllim *və s.*; **~ bread/ clothes/ furniture / potatoes /carrots /wine,** *etc.* təzə çörək / paltar /mebel / kartof / kök / şərab *və s.*; **the ~ baby** *d.d.* yeni doğulmuş/ təzə doğulmuş uşaq; **~ Parliament** yeni seçilmiş Parlament; **~ from the country** kənddən təzəcə/yenicə gəlmiş; 2. yeni kəşf edilmiş / tapılmış; **a ~ star / planet / island,** *etc.* yeni kəşf edilmiş ulduz/planet/ada və s.; 3. çağdaş, müasir; **~ literature** çağdaş / müasir ədəbiyyat; **~ furniture** müasir mebel; **~ fashions** çağdaş /müasir dəblər; 4. *(çox vaxt* **to)** yad, tanış olmayan; alışmamış; *He is new to the work O hələ işə alışmayıb; I am new to Moscow Mən hələ Moskvanı yaxşı tanımıram;* **~ to war** müharibəyə alışmamış *(əsgər haq.)*; **~ to the saddle** minilməmiş, xam *(at haq.)*; **~ soldier** xidmətə yeni gəlmiş əsgər; 5. başqa, ayrı cür, özgə; yeniləşmiş; **to lead a ~ life** həyat tərzini dəyişdirmək, yeni həyat sürmək; *He has become a new man O, tamamilə başqa adam olub;* 6. yeni, təzə, daha bir; *I found a new mistake Mən yeni / daha bir səhv tapdım;*

◊ **~ army** müharibə dövrü yaradılan ordu; *Tomorrow will be a new day ≅ Sabah hər şey dəyişə bilər, ≅ Axşamın xeyrindən sabahın şəri yaxşıdır*

**new-born** ['nju:bɔ:n] *adj* təzə / yeni doğulmuş, yenicə / təzəcə doğulmuş; **~ baby** yenicə / təzəcə doğulmuş uşaq

**new-built** ['nju:bılt] *adj* təzə, yeni *(tikinti haq.)*, təzə tikilmiş; **a ~ house** təzə tikilmiş ev

**new-coined** ['nju:kɔɪnd] *adj* **1.** təzəcə/yenicə zərb olunmuş *(sikkə haq.)*; **2.** təzəcə düşünülüb tapılmış / uydurulmuş; yeni, təzə; ~ **words** dildə yeni yaranmış sözlər
**new-comer** ['nju:'kʌmə^r] *n* təzə gəlmiş adam *(bir yerə)*
**new-day** ['nju:deɪ] *adj amer.* çağdaş, müasir, hazırkı
**new-fallen** ['nju:ˌfɔ:lən] *adj* yenicə /təzəcə yağmış *(qar haq.)*
**newish** ['nju:ɪʃ] *adj* təztəzə, yeni
**new-laid** ['nju:leɪd] *adj* təzəcə / yenicə yumurtlanmış. toyuğun yenicə / təzəcə altından götürülmüş; ~ **egg** yenicə toyuğun altından götürülmüş yumurta
**newly** ['nju:lɪ] *adv* **1.** yeni, təzə, təzəcə *(Adətən feli sifət qarşısında işlədilir)*; **a ~ married couple** yeni / yenicə evlənmiş ər-arvad; *The door / The gate has been newly painted Qapı/Darvaza yenicə/təzəcə rənglənib*; **2.** yenidən, təzədən; yeni qaydada; **furniture ~ arranged** yeni qaydada düzülmüş mebel
**newly-wed** ['nju:lɪwed] *n* yeni evlənmiş kişi /qadın; **the ~s** təzəcə toyu olmuş oğlan və qız
**new-made** ['nju:'meɪd] *adj* təzə düzəldilmiş, təzə; ~ **grave** təzə qəbir
**new-moon** ['nju:'mu:n] *n* **1.** təzə ay *(ayın yenidən görünməsi)*; **2.** ayın təzə çıxdığı vaxt
**new-mown** ['nju:'moun] *adj* yeni çalınmış/biçilmiş *(ot haq.)*
**newness** ['nju:nɪs] *n* yenilik, təzəlik
**news** [nju:z] *n* **1.** yenilik; xəbər; *What's the news? Nə xəbər var? Have you heard the news? Xəbəri eşitmisənmi?/eşitmisinizmi?; Have you any news of Nick? Sənin / sizin Nikdən xəbərin /xəbəriniz varmı?*; **the home/foreign** ~ daxili/xarici xəbərlər; *I've heard no news from him for a long time Mənim ondan uzun müddətdir ki, xəbərim yoxdur*; **2.** məlumat, məlumat vermə *(mətbuatda, radioda)*; xəbər; **latest** ~ son xəbərlər; **foreign** ~ xarici xəbərlər; **to break the ~ to *smb.*** ağır xəbəri bir kəsə ehmalca çatdırmaq; **to listen to the** ~ xəbərə / məlumata qulaq asmaq; **3.** = **newspaper**;
◊ *No news is good news at. söz.* ≅ *Yeni xəbərin olmaması, yaxşı xəbərdir; Bad news travels quickly, ill news flies fast at. söz.* ≅ *Bəd xəbərin atı yüyürək olar*
**news-agent** ['nju:zˌeɪdʒənt] *n* qəzet satan, qəzet köşkünün sahibi
**news-boy** ['nju:zbɔɪ] *n* qəzetsatan *(xüs. gənc oğlan haq.)*
**newscast**[1] ['nju:zka:st] *n* son xəbərlər *(radio və ya televiziya ilə verilən)*
**newscast**[2] ['nju:zka:st] *v* son xəbərləri vermək *(radio və ya televiziya ilə)*
**newscaster** ['nju:zˌka:stə^r] *n* son xəbərləri verən diktor *(radio və ya televiziya ilə)*
**newscasting** ['nju:zˌka:stɪŋ] *n* son xəbərlərin verilişi *(radio və ya televiziya ilə)*
**news-letter** ['nju:z'letə^r] *n* məlumat bülleteni *(firmanın və s.)*
**news-man** ['nju:zmæn] *n* (*pl* **-men** [-men]) **1.** qəzetçi, qəzetsatan; **2.** *arx.* məlumat toplayan
**newsmonger** ['nju:zˌmʌŋgə^r] *n* xəbərçi; sözgəzdirən, qeybətçi, dedi-qoduçu
**newspaper**[1] ['nju:sˌpeɪpə^r] *n* qəzet; **a daily** ~ gündəlik /gündə çıxan qəzet; **a weekly** ~ həftəlik qəzet; **an evening** ~ axşamlar çıxan qəzet; **to read a** ~ qəzet oxumaq; *Have you read today's newspaper Sən / Siz bugünki qəzeti oxumusanmı?/oxumusunuzmu?*
**newspaper**[2] ['nju:sˌpeɪpə^r] *adj* qəzet; ~ **heading** qəzet başlığı; ~ **clipping / cutting** qəzetdən kəsilib çıxarılmış hissələr *(məqalələr)*; ~ **office** qəzet redaksiyası
**newspaper man** ['nju:sˌpeɪpə'mæn] *n* jurnalist, qəzet əməkdaşı / işçisi
**newsprint** ['nju:zprɪnt] *n* qəzet kağızı, qəzet çap etmək üçün kağız
**newsreel** ['nju:zri:l] *n* kinoxronika, kinojurnal
**news-room** ['nju:zru:m] *n* qiraətxana, oxu zalı *(dövri mətbuat olan otaq)*, qəzet zalı
**news-stand** ['nju:zstænd] *n* qəzet köşkü, qəzet satılan köşk
**news-theatre** ['nju:zˌθɪətə^r] *n* xronikal sənədli filmləri nümayiş etdirən kinoteatr
**newsworthy** ['nju:zˌwə:ðɪ] *adj* maraqlı, vacib; məlumat verilməyə layiq *(hadisə haq.)*; *Nothing very newsworthy happened last week Keçən həftə maraqlı / məlumat verilməyə layiq heç bir şey baş vermədi*
**newt** [nju:t] *n zool.* triton *(kərtənkələyəoxşar heyvan)*
**next**[1] [nekst] *adj* **1.** o biri / birisi, gələn; **in the ~ chapter** o biri fəsildə; ~ **day** o biri gün; ~ **week / year** gələn həftə / il; *Next Monday is 12 April Gələn bazar ertəsi aprelin 12-dir*; **2.** növbəti; **the ~ name on the list** siyahıda növbəti ad; *Who's next, please? Növbəti kimdir, zəhmət olmasa, buyursun; The next train to Istambul is at 10,00 İstanbula növbəti qatar saat 10-da gedir*; **3.** ən yaxın, qonşu; **my ~ neighbour** mənim ən yaxın qonşum; ~ **door** qonşuluqda; **to live ~ door** qonşuluqda yaşamaq;
◊ **the ~ world** o dünya
**next**[2] [nekst] *adv* **1.** sonra; ondan sonra; *What did you do next? Sonra sən / siz nə etdin / etdiniz?; Next we went to the park Sonra biz parka getdik; He is a doctor first, poet next O, öncə həkimdir, sonra şair*; **2.** gələn dəfə; yenidən; bir də; *When shall I next meet you? Mən səninlə / sizinlə bir də nə vaxt görüşəcəm*
**next**[3] [nekst] *prep* yanında, yan-yana, yaxınlığında; **a seat ~ the window** pəncərənin yanında oturacaq; *Whom did you sit next at dinner? Nahar vaxtı sən / siz kimlə yan-yana oturmuşdun? / oturmuşdunuz?; Our hotel is next the post office Bizim mehmanxana poçtun yaxınlığındadır*; **the thing ~ my heart** mənə ən əziz olan şey



**next-door** ['nekst'dɔ:] *adv* ən yaxın, qonşu; ~ **neighbours** ən yaxın qonşular; *The cat is from the house next door Pişik qonşunundur; Pişik qonşu evindir; The manager's office is just next door Menecerin ofisi lap qonşuluqdadır*
**next to**[1] [neksttu:] *adv* demək olar ki, təxminən, təqribən; ~ **impossible** demək olar ki, mümkün deyil; *It was next to impossible to escape them Onlardan yaxa qurtarmaq demək olar ki,/təxminən mümkün deyildi*; ~ **nothing** demək olar ki, heç nə; **to eat ~ nothing** təxminən heç nə yeməmək; *There was next to nobody at the meeting Demək olar ki, iclasa heç kim / heç kəs gəlməmişdi; There is next to no evidence Demək olar ki, / Təxminən heç bir sübut yoxdur*
**next to**[2] ['nekstu:] *prep* **1.** yaxınında, yaxınlığında, yan-yana; **a seat ~ the fire** buxarının yaxınlığındakı oturacaq / yer; *His garden is next to mine Onun bağı bizimki ilə yan-yanadır*; **2.** sonra; *Ganja is the largest city in Azerbaijan next to Baki Bakıdan sonra Azərbaycanda Gəncə böyük şəhərdir; Next to Beethoven he liked Bach best of all Bethovendən sonra onun ən sevimli bəstəçisi Bax idi*
**nexus** ['neksəs] *n* **1.** əlaqə; **causal** ~ səbəbiyyət əlaqəsi; **2.** *qram.* neksus, təyinolunan
**nib**[1] [nɪb] *n* dəmir qələm ucluğu
**nib**[2] [nɪb] *v* qələmə metal ucluq taxmaq
**nibble**[1] ['nɪbl] *n* **1.** gəmirmə, çeynəmə, yemə, dişləmə, dişləyib qoparma; **2.** bir azca, bir damcı; **to take a** ~ bir azca dişləyib qopartmaq; **3.** tilova gəlmə / düşmə *(balıq haq.)*; *I felt a nibble at the bait Mən hiss etdim ki, tora balıq düşüb*
**nibble**[2] ['nɪbl] *v* **1.** gəmirib yemək, çeynəmək, yemək, dişləmək; gəmirmək *(sümüyü)*; qopartmaq *(otu)*; *The mice have nibbled away a part of the cheese Siçanlar pendirin bir hissəsini (gəmirib) yeyiblər*; **2.** ötəri/səthi toxunmaq; **to ~ at a subject** mövzuya səthi toxunmaq; *He nibbled at the subject, but didn't make a definite decision O, mövzuya ötəri toxundu, amma müəyyən fikir söyləmədi*; **3.** tilova gəlmək *(balıq haq.)*; *The fish nibbled (at) the bait Balıq tilova düşdü*; **4.** tərəddüd etmək, qətiyyətsizlik göstərmək; **to ~ at a suggestion** təklif etməkdə qətiyyətsizlik göstərmək/tərəddüd etmək
**nice** [naɪs] *adj* (**-r, -st**) **1.** yaxşı, xoşagələn, gözoxşayan, gözəl, qəşəng, sevimli; ~ **weather** yaxşı / gözəl hava; **a ~ child** qəşəng/gözəl uşaq; **a ~ day** gözəl gün; **a ~ time** yaxşı/gözəl vaxt; *We had a nice time at the beach Biz çimərlikdə gözəl vaxt keçirdik*; **a ~ face** gözəl/gözoxşayan/xoşagələn sifət; **a ~ boy/girl** sevimli / xoşagələn oğlan / qız; **a ~ home** rahat / qəşəng ev; *Nice to meet you! Səni / Sizi görmək çox xoşdur!*; **2.** (**of, to, about**) mehriban, lütfkar; gülərüzlü, iltifatlı; diqqətli; ədəbli, nəzakətli; *This is very nice of you Siz çox iltifatlısınız; He was nice to me O, mənə çox mehribanlıq / lütfkarlıq göstərdi; She was very nice about the incident Hadisə zamanı o, çox nəzakətli / ədəbli davrandı; It's hard to be nice to someone you don't like Xoşlamadığın adama qarşı mehriban / iltifatlı olmaq çox çətindir*; **3.** təvazökar; ədəbli, utancaq, tərbiyəli; ~ **people** tərbiyəli / vicdanlı adamlar; **4.** dəqiq, ehtiyatlı; çətin, mürəkkəb *(sual və s. haq.)*; **one of the nicest problems for a man to solve** insanın həll etməli olduğu ən çətin /mürəkkəb problemlərdən biri; **5.** kəskin; incə, həssas, diqqətli, canıyanan; ~ **distinction** incə fərq; ~ **ear** həssas qulaq; ~ **eye for distances** məsafəni gözəyarı dəqiq müəyyənləşdirmə həssaslığı; ~ **judgement** dəqiq mühakimə; ~ **taste** incə zövq; **6.** tələbkar, ciddi; ~ **critic** tələbkar tənqidçi; ~ **in *one's* food** yeməyində tələbkar
**nice-looking** ['naɪs'lukɪŋ] *adj* cazibədar, cazibəli, cəlbedən, məlahətli; xoşsifət, qanışirin; **a ~ woman** cazibədar / məlahətli / xoşsifət qadın
**nicely** [naɪslɪ] *adv* **1.** yaxşı, gözəl, qəşəng, xoş; **2.** *d.d.* tamamilə, əla; *That will suit me nicely Bu mənə əla yaraşar*; **to do ~ 1)** işləri əla getmək; **2)** sağalmaq, yaxşılaşmaq; *Her new business is doing very nicely Onun yeni işi lap əladır; The patient is doing nicely Xəstənin halı yaxşılaşır*
**nicety** ['naɪsɪtɪ] *n* **1.** dəqiqlik, dürüstlük, düzgünlük, doğruluq; sərrastlıq; ~ **of judgement** mühakimənin / hökmün dəqiqliyi; **to a ~** tam dəqiqliyilə, müfəssəl, ətraflı surətdə, təfərrüatilə, təfsilatı ilə; *You judged the distance to a nicety Sən / Siz məsafəni çox düzgün müəyyənləşdirdin / müəyyənləşdirdiniz; He judged the distance to a nicety O, məsafəni tam dəqiqliyi ilə müəyyən etdi*; **2.** diqqət; ehtiyat, ehtiyatlılıq; **a point of great** ~ çox ehtiyatlılıq / dəqiqlik tələb edən məsələ; **3.** mürəkkəblik, çətinlik; *This question is one of considerable nicety and difficulty Bu məsələ çətin və mürəkkəbdir*; **4.** əsasən *pl* dəqiqlik, təfərrüat, təfsilat; **niceties of legal proof** hüquqi dəlilin dəqiqliyi / təfərrüatı; *Let's speak of the question in general, we haven't time to consider all the niceties Gəl / Gəlin məsələdən ümumi danışaq, onun bütün təfərrüatına varmağa vaxtımız yoxdur*; **5.** ehtiyatlılıq, ciddilik, tələbkarlıq, yaxşını yamandan seçmə; **6.** mehribanlıq, xoşüzlülük, üzügülərlik, iltifat
**niche**[1] [nɪtʃ, ni:ʃ] *n* **1.** taxça, divar oyuğu; *Two small candles and some flowers were placed in a niche Taxçaya iki balaca şam və bir neçə çiçək qoyulmuşdu*; **2.** özünə layiq bir yer; **to find a ~ for oneself** həyatda öz yerini/özünə layiq

yer tapmaq; 3. sığınacaq, yurd, daldalanacaq yer
**niche**[2] [nɪtʃ, ni:ʃ] *v* 1. taxçaya qoymaq, taxçada yerləşdirmək; 2.: **to ~ oneself** özünə sığınacaq / yurd tapmaq, sığınmaq
**nick**[1] [nɪk] *n* 1. kərtik, nişan *(ağacda və s.)*; çapıq; **to make a ~ on the tree with the knife** ağac üzərində bıçaqla kərtik açmaq; 2. dəqiq vaxt / an, kritik an; **in the very ~ of time** düz / dəqiq vaxtında; **in the ~** son anda; *We arrived in the nick of time Biz düz vaxtında gəlib çatdıq;*
◊ **to be in good /bad ~** yaxşı /pis vəziyyətdə olmaq; *She's in pretty good nick for a 70 years-old Yetmiş yaş üçün o, çox yaxşı vəziyyətdədir; My car's in bad nick Mənim maşınım pis vəziyyətdədir; The doctor says my heart is still in good nick Həkim deyir ki, mənim ürəyim hələ də yaxşı vəziyyətdədir*
**nick**[2] [nɪk] *v* 1. kərtik açmaq, nişan etmək, nişan qoymaq *(ağacda)*; 2. kərtik açmaqla saymaq; 3. həbs etmək; tutmaq; *He was nicked for stealing Onu oğurluq üstündə həbs etdilər;* 4. oğurlamaq; *Who's nicked my pen? Mənim qələmimi kim oğurlayıb?;* 5. cızmaq; *He nicked the wall in moving the table Stolu sürüyəndə o, divarı cızdı*
**nickel**[1] ['nɪkl] *n* 1. *kim.* nikel *(gümüşü-ağ rəngli çətin əriyən metal / kimyəvi element)*; 2. *amer.* beş sent dəyərində sikkə / nikeldən kəsilmiş pul
**nickel**[2] ['nɪkl] *v* nikelləmək, üzərinə nikel çəkmək
**nick-nack** ['nɪknæk] *n* = **knick-knack**
**nick-name**[1] ['nɪkneɪm] *n* ayama, ləqəb; *His nick-name was "Rabbit" because of his big front teeth Qabaq dişləri böyük olduğundan ona "Dovşan" ləqəbi vermişdilər*
**nick-name**[2] ['nɪkneɪm] *v* ləqəb vermək, ayama qoymaq; *She was nicknamed "Madonna" Ona "Madonna" ləqəbi vermişdilər*
**nicotine** ['nɪkəti:n] *n kim.* nikotin; **teeth / fingers stained with ~** nikotindən saralmış dişlər / barmaqlar
**niece** [ni:s] *n* qardaş/ bacı qızı, baldız/qayın qızı
**nifty** ['nɪftɪ] *adj amer. d.d.* ( **-ier, -iest**) zərif, gözəl, qəşəng, incə; əla; dəbdə olan, modalı; **~ suit** modalı/ son dəbdə tikilmiş kostyum; **~ legs** zərif / qəşəng qıçlar; **a ~ little machine** balaca qəşəng maşın; *He's a nifty performer on the guitar O, əla gitara çalır*
**niggard** ['nɪgəd] *n* 1. xəsis / simic / dargöz adam; 2. cüzilik, azlıq
**niggardly**[1] ['nɪgədlɪ] *adj* 1. xəsis, simic, dargöz, tamahkar; **~ rich man** dövlətli xəsis/simic adam; **a ~ attitude** dargöz münasibət; **a ~ husband** xəsis / simic ər; 2. cüzi, az, çox cüzi/kiçik; **~ praise** az/ cüzi tərif
**niggardly**[2] ['nɪgədlɪ] *adv* həddindən artıq qənaətlə, çox az, az-maz / azca
**nigger** ['nɪgəʳ] *n amer. kin.* zənci;
**a to work like a ~** ≅ öküz kimi işləmək

**niggle** ['nɪgl] *v* 1. boş/mənasız işlə məşğul olmaq; 2. *arx.* xırdaçılıq etmək; *Don't niggle! Xırdaçılıq etmə!/etməyin!;* 3. bir kəsi mütəmadi olaraq narahat etmək; **a doubt which ~ed at his brain** onun beynindən çıxmayan şübhə
**niggling** ['nɪglɪŋ] *adj* 1. xırda, boş, mənasız, əhəmiyyətsiz; *Don't waste time on niggling details Xırda / Əhəmiyyətsiz təfərrüata vaxt sərf etmə / etməyiniz;* 2. cansıxıcı, zəhlətökən; *The mending of all the small holes in the socks is the niggling job Corabda kiçik yırtıq-deşikləri yamamaq cansıxıcı işdir;* 3. yüngül narahatçılıq yaradan/törədən; **a ~ pain** narahatedici yüngül ağrı; **~ doubt** narahatlıq yaradan şübhə; 4. qarışıq, dolaşıq, aydın olmayan, çətin oxunan *(əlyazması haq.)*
**nigh**[1] [naɪ] *adj şair. arx.* 1. yaxın, yaxındakı; *The time has drawn nigh Zaman/Vaxt yaxınlaşıb;* 2. düz, qısa *(yol haq.)*; 3. xəsis, simic
**nigh**[2] [naɪ] *v şair.* yaxınlaşmaq; *Night is nighing Gecə yaxınlaşır*
**nigh**[3] [naɪ] *adv şair.* 1. yaxın, yaxına; *Come nigh Yaxın / Yaxına gəl / gəlin; Night is drawing nigh Gecə yaxınlaşır;* 2. demək olar ki, təxminən, təqribən; **~ out of his wits** təxminən dəli/gic
**nigh**[4] [naɪ] *prep* yanında, yaxınlığında; *Stay nigh me Mənim yanımda dur / durun; He is nigh death O, can üstündədir*
**nighness** [naɪnɪs] *n şair.* yaxınlıq; **the ~ of blood** qan qohumluğu
**night**[1] [naɪt] *n* 1. gecə; *Night fell Gecə düşdü;* **all ~ long** bütün gecə; *We sat up all night long talking Biz bütün gecəni oturub söhbət etdik;* **~ after ~** hər gecə, gecəbəgecə; **at ~** gecə, gecə vaxtı; **to have / to pass a good ~** gecəni yaxşı yatmaq; **to have / to pass a bad ~** gecəni pis yatmaq; 2. axşam; **at 8 o'clock at ~** axşam saat 8-də; **by ~** axşamlar; **last ~** keçən gecə / axşam; *We watched television last night Biz keçən axşam televiziyaya baxdıq;*
◊ **first ~** *teatr.* birinci tamaşa, premyera *(pyesin teatrda ilk tamaşası)*; **to make a ~ of it** bütün gecəni kef çəkmək / eyş-işrətlə məşğul olmaq; **~ and day** gecə və gündüz, gecə-gündüz; *Night is too young Gecədən hələ az keçib;* **at dead of ~, in the depth of ~** gecədən xeyli keçmiş, gecənin oğlan çağında
**night**[2] [naɪt] *adj* gecə; **~ robe** gecə köynəyi; **~ duty** gecə növbəsi/növbətçiliyi; **~ action** *hərb.* gecə vuruşu; **~ dew** gecə şehi; **~ butterfly** gecə kəpənəyi
**night-bell** ['naɪtbel] *n* gecə zəngi *(xəstəxanada və s. növbətçilər üçün çalınan)*
**night-bird** ['naɪtbə:d] *n* 1. gecəquşu *(yəni gecələr görünən quş)*; 2. gecəquşu *(fahişələr haq.)*
**night-cap** ['naɪtkæp] *n* gecəpapağı
**night-clothes** ['naɪtklouðz] *n* 1. *(cəm fellə işlənir)*



gecə paltarı; 2. yüngül ev paltarı
**night-club** ['naɪtklʌb] *n* gecə klubu; gecə restoranı
**night-dress** ['naɪtdres] *n* gecə qadın köynəyi
**nightfall** ['naɪtfɔ:l] *n* gecənin düşməsi; toran, qaş qaralan vaxt
**nightingale** ['naɪtɪŋgeɪl] *n zool.* bülbül; **to sing like a ~** bülbül kimi oxumaq/cəh-cəh vurmaq
**nightjar** ['naɪtdʒa:] *n zool.* çobanaldadan *(quş)*
**night-light** ['naɪtlaɪt] *n* gecə lampası
**night-long** ['naɪtlɔŋ] *adj* gecə boyu / bütün gecə davam edən, bütün gecə
**nightly**[1] ['naɪtlɪ] *adj* hər gecə olan/baş verən; **~ watches** hər gecə çəkilən növbə; **~ performance** hər gecə göstərilən tamaşa; **the ~ bombardment** hər gecə edilən bombardman
**nightly**[2] ['naɪtlɪ] *adv* 1. hər gecə; *This film is on twice nightly Bu film hər gecə iki dəfə göstərilir;* 2. gecə, gecələr
**nightmare** ['naɪtmeəʳ] *n* 1. qarabasma, vahimə, qorxulu /pis yuxu; *He had a nightmare O qorxulu yuxu gördü;* 2. *məc.* dəhşət; **the ~ of war** müharibənin dəhşəti
**night-robber** ['naɪt,rɔbəʳ] *n* gecə oğrusu / quldur
**nights** [naɪts] *adv amer. d.d.* gecələr; **to work ~** gecələr işləmək, gecə növbəsində işləmək
**night-school** ['naɪtsku:l] *n* axşam məktəbi / kursları
**night-shift** ['naɪtʃɪft] *n* gecə növbəsi
**night-shirt** ['naɪtʃə:t] *n* gecə köynəyi *(kişilər üçün)*
**night-suit** ['naɪtsju:t] *n* pijama *(yüngül parçadan tikilmiş yataq və ev paltarı)*
**night-time** ['naɪttaɪm] *n* gecə, gecə vaxtı; **in the ~, by ~** gecə
**night-walker** ['naɪt,wɔ:kəʳ] *n* 1. lunatik, somnambul *(yuxuda durub gəzən adam)*; 2. gecə fəal olan heyvan
**night-watchman** ['naɪt'wɔtʃmən] *n* (*pl* **-men** [-mən]) gecə gözətçisi / keşikçisi / qarovulçusu
**nightwear** ['naɪtweəʳ] *n top.i* gecə dəyişəyi; gecə köynəkləri, pijamalar və s.
**night-work** ['naɪtwə:k] *n* axşam / gecə işi
**nighty** ['naɪtɪ] *n* gecə köynəyi *(qadın / uşaq üçün)*
**nihilism** ['naɪɪlɪzəm] *n* nihilizm *(nihilistin dünyagörüşü (bax: nihilist)*
**nihilist** ['naɪɪlɪst] *n* nihilist *(hər şeyi danan adam)*
**nihilistic** [,naɪ'lɪstɪk] *adj* nihilist
**nil** [nɪl] *n* heç bir, heç nə; sıfır *(xüs. oyun hesabında); The profits were nil Heç bir gəlir olmadı; The result of the game was 2-0 (two-nil) Oyunun nəticəsi 2-0 (iki-sıfır) oldu*
**nimble** ['nɪmbl] *adj* 1. çevik, zirək, diribaş, cəld; qıvraq, yüngül *(hərəkət haq.)*; **a ~ climber** çevik / zirək alpinist; **~ fingers** çevik / cəld barmaqlar; **a piano player with ~ fingers** cəld/ çevik barmaqlı pianoçu; **to be ~ on *one's* feet** ayaqdan qıvraq / zirək / cəld /yüngül olmaq; 2. iti,

zirək; **~ wits** hazırcavablıq; 3. fərasətli, anlaqlı, düşüncəli, zəkalı, tez başa düşən, hazırcavab; **~ at / in *smth.*, ~ to do *smth.*** bir şeyi etməkdə mahir olmaq; 4. dürüst, dəqiq *(cavab haq.)*; **~ jest** dəqiq / dürüst hazırcavablıq
**nimble-fingered** ['nɪmbl'fɪŋgəd] *adj* çevik / zirək barmaqlı *(cibgir haq.)*
**nimble-footed** ['nɪmbl'futɪd] *adj* itiayaq, itigedən, ayaqdan zirək
**nimble-minded** ['nɪmbl'maɪndɪd] *adj* = **nimble-witted**
**nimble-witted** ['nɪmbl'wɪtɪd] *adj* fərasətli, anlaqlı, düşüncəli, zəkalı, zirək, fəhmli, tez başa düşən; hazırcavab, ağıllı
**nimbly** ['nɪmblɪ] *adv* 1. sürətli, sürətlə, iti, cəld; zirək, çevik, diribaş; məharətlə, bacarıqla; yüngül, yüngülcə; asanca; 2. hazırcavablıqla, fərasətlə, ustalıqla, bacarıqla, ağılla, ağıllı; 3. dəqiq, dürüst, doğru, sərrast *(cavab haq.)*
**nimbus** ['nɪmbəs] *n* (*pl* **nimbuses** *və ya* **nimbi** [-baɪ]) böyük qara yağış buludu
**nincompoop** ['nɪnkəmpu:p] *n d.d.* axmaq, sarsaq, gic, sadədil, maymaq, ağzıaçıq, fərsiz *(adam)*
**nine** [naɪn] *num* 1. doqquz; **~ books** doqquz kitab; *Nine and nine make eighteen Doqquz üstəgəl doqquz on səkkiz edir; There were nine of them Onlar doqquz nəfər idilər;* 2. doqquzluq, doqquz rəqəmi *(həm də* **figure of ~***)*; 3. doqquz *(nömrəli)*, doqquzuncu; **Room ~** doqquz nömrəli otaq, doqquzuncu otaq; 4. doqquzluq *(qumar kağızlarında)*; **~ of hearts** ürəkşəkilli doqquzluq *(qumar kağızlarında)*; 5. doqquz yaş; *He is nine Onun doqquz yaşı var;* **a boy of ~** doqquz yaşlı oğlan; 6. *saat.* doqquz; *He will come at nine O, saat doqquzda gələcək*
**ninefold**[1] ['naɪnfould] *adj* doqquz hissədən ibarət; doqquzqat, doqquz dəfə artırılmış, doqquzqat çox
**ninefold**[2] ['naɪnfould] *adv* doqquz dəfə çox; **to increase ~** doqquz dəfə artırmaq / artırılmaq
**nineteen** ['naɪn'ti:n] *n* 1. *(rəqəm)* on doqquz; **~ students** on doqquz tələbə; *Nineteen and nineteen make thirty-eight On doqquz üstəgəl on doqquz otuz səkkiz eylər; There were nineteen of them Onlar on doqquz (nəfər) idilər;* 2. on doqquzuncu nömrə, nömrə on doqquz; **Chapter ~** on doqquzuncu fəsil; **Room ~** on doqquzuncu otaq; 3. on doqquz yaş; *She is nineteen Onun on doqquz yaşı var, O, on doqquz yaşındadır*
**nineteenth** ['naɪn'ti:nθ] *adj* on doqquzuncu; **the ~ lesson** on doqquzuncu dərs *(dərslik kitablarında)*
**nineties** ['naɪntɪz] *n pl* 1. 90-dan 99-a qədər olan rəqəmlər; 2. (**the ~**) doxsanıncı illər *(əsrdə)*; 3. **90-dan 99-a** qədər olan yaş; *She is in her nineties O, ömrünün 90-cı illərini yaşayır*
**ninetieth** ['naɪntɪɪθ] *adj (rəqəm)* doxsanıncı; *He is in his ninetieth year O, doxsan yaşındadır*

**ninety** [naıntı] *n* **1.** doxsan; ~ **trees** doxsan ağac; **2.** doxsanıncı *(bu halda* **ninety** *sözü təyin etdiyi sözdən sonra durur)*; **page** ~ doxsanıncı səhifə; **Room** ~ doxsan nömrəli otaq, doxsanıncı otaq; **at** ~ doxsan yaşında; **a man of** ~ doxsan yaşlı qoca

**ninny** ['nını] *n* axmaq, sarsaq, maymaq, sadədil, ağzıaçıq, fərsiz, gic; *Don't be such a ninny! Belə axmaq / sarsaq / fərsiz olma! / olmayın!*

**ninny-hammer** ['nını.hæmə$^r$] *n* = **ninny**

**ninth** [naınθ] *adj* doqquzuncu; *He is in his ninth year O, doqquz yaşının içindədir; He is doing it for the ninth time O, bunu doqquzuncu dəfə edir*

**nip$^1$** [nıp] *n* **1.** çimdik, çimdikləmə, çimdik götürmə; **to give a** ~ çimdikləmək, çimdik götürmək; **2.** dişləmə, qapma; dişlənib qoparılmış tikə; *That dog gave me a nip on the leg O it mənim qıçımı dişlədi / qapdı;* **3.** soyuma, soyuqluq; *There's a distinct nip in the air; winter's coming Havada aydın hiss olunan soyuqluq var; qış gəlir;* **4.** kəskinlik *(pendirdə)*; old **cheese with a** ~ **in it** kəskin dadı olan köhnə pendir; **5.** bir udum / qurtum *(xüs. spirtli içki haq.)*; **a** ~ **of brandy** bir qurtum konyak / brendi

**nip$^2$** [nıp] *v* (**-pp-**; *pt* **nipped** [-t]; *pp* **nipt**) **1.** çimdikləmək; qapmaq, tutmaq, dişlə-mək *(it haq.)*; *She nipped me on the arm O, mənim qolumdan çimdiklədi; The dog nipped the postman on the leg İt poçtalyonun qıçından tutdu / dişlədi; Don't go too near the dog; he nips İtə çox yaxın getmə / getməyin, o qapır;* **2.** vurmaq *(şaxta haq.)*; *Frost nipped the plants Şaxta bitkiləri vurdu;* **3.** dayandırmaq, qarşısını almaq; **to** ~ **the tide** qabarmanın qarşısını almaq; **4.** *k.t.* başını vurmaq *(bitkilərin)*; **5.** *d.d.* qaçmaq, əkilmək, götürülmək, daban almaq; tələsik getmək; tələsmək; *Nip upstairs and bring me a handkerchief Yuxarı qaç / qaçın və mənə bir əl yaylığı gətir / gətirin;*

◊ **to** ~ **in the bud** ≅ beşikdə boğmaq

**nipper** ['nıpə$^r$] *n* **I** **1.** dişləyən, qapan, tutan *(heyvan haq.)*; **2.** *pl* itiağız kəlbətin; **3.** qısqac *(alət) (həm də* **a pair of** ~**s)**; **4.** qabaq diş *(atda)*; **5.** *pl* qandal, əl qandalı; **6.** *pl d.d.* pensne *(eynək)*

**nipper** ['nıpə$^r$] *n* **II** oğlan, uşaq; cavan, gənc; **a cheeky young** ~ həyasız/utanmaz / sırtıq uşaq

**nipple** ['nıpl] *n* **1.** *anat.* döşün / məmənin giləsi; **2.** əmzik; **3.** qabarıq; təpə, təpəlik

**nippy** ['nıpı] *adj* (**-ier, -iest**) **1.** cəld, sürətli; **a** ~ **little car** balaca sürətli maşın; **2.** soyuq; *It's a bit nippy today, isn't it? Bu gün bir az soyuqdur, elə deyilmi?*

**nit** [nıt] *n* **1.** sirkə *(bit yumurtası)*; **2.** *jarq.* ağılsız, gic, axmaq, sarsaq *(adam)*;

◊ **dead as a** ~ ölüvay, cılız, həyat nişanəsi olmayan *(adam)*, ölü bit

**nitty** ['nıtı] *adj* sirkəli, sirkə basmış

**nitwit** ['nıtwıt] *n* sarsaq/gic/səfeh adam; *He's a complete nitwit O, tamam gicdir/sarsaqdır/səfehdir*

**nix$^1$** [nıks] *n* su pərisi

**nix$^2$** [nıks] *v* inkar cavab vermək; rədd etmək, icazə verməmək; *The city nixed the plan to build a theatre with public money İngiltərənin maliyyə dairələri ümumxalq puluna teatr tikmək planını rədd etdi / planına icazə vermədi*

**nix$^3$** [nıks] *adv* xeyr, yox; *Will you give me a ride home? Nix, man! I'm not going that way Məni evə ata bilərsənmi? / bilərsinizmi? Xeyr, a kişi! Mən o yolla getmirəm; Father said nix to our plan, so we couldn't go Ata bizim planımıza yox dedi, beləliklə biz gedə bilmədik*

**no$^1$** [nou] *adj* **1.** heç bir; yox; *He has no money Onun heç bir pulu yoxdur; There will be no difficulty Heç bir çətinlik olmayacaq;* ~ **man** heç bir adam; *No man can stand this pain Heç bir adam bu ağrıya dözə bilməz; No sensible man would say this Heç bir ağlı başında olan adam bunu deməz; No one man can do this Heç bir adam bunu təkbaşına edə bilməz; No two men think alike Heç bir iki adam eyni düşünmür;* **2.** demək olar ki; çox az; *It's no distance to the post office Demək olar ki, poçt lap yaxındır;* **in** ~ **time** çox tez, çox az vaxt içində; *We finished the work in no time Biz işi çox az vaxtda qurtardıq;* **3.** qadağa, yasaq bildirir: *No Smoking! Papiros çəkmək olmaz!, No Parking Maşın saxlamaq qadağandır! No Road! Yol yoxdur! No compromise! Heç bir kompromis ola bilməz! No doubt Əlbəttə, şübhəsiz*

**no$^2$** [nou] *adv (sifət və ya zərfin müqayisə formasılə işlənərək inkarlıq bildirir və Azərbaycan türkcəsinə əsasən* **-mə-, -ma-** *inkar şəkilçiləri və ya* **deyil, yox** *sözlərilə tərcümə edilir) I went no further than the station Mən vağzaldan o tərəfə getmədim; I can wait no more Mən artıq gözləyə bilmirəm; I'm glad it's no worse Mən şadam ki, pis olmadı; He's no longer in Washington O, artıq Vaşinqtonda deyil; She's no better yet O, hələ yaxşı deyil; If you are no better by tomorrow, I'll call a doctor Sabaha qədər yaxşılaşmasan/yaxşılaşmasanız, mən həkim çağıracam*

**no$^3$** [nou] *mod.word* xeyr, yox; *-Is it cold outside? -No, it's warm Bayırda soyuqdurmu? -Xeyr, mülayimdir; Would you like a cup of tea? - No, thank you Bir fincan çay istərdinizmi? -Xeyr /-Yox, sağ ol / olun; -Is it raining? -No, it isn't Yağış yağırmı? -Xeyr /-Yox, yağmır; -Haven't you finished your work? No, not yet - İşini / İşinizi qurtarmısanmı? / qurtarmısınızmı? -Xeyr, hələ yox*

**nobble** ['nɔbl] *v jarq.* **1.** dərman və s. verməklə atı korlamaq *(cıdır yarışından əvvəl)*; **2.** ələ almaq/gətirmək *(rüşvət verməklə)*; *There's no chance in trying to nobble the jury Jürini ələ almaq üçün imkan yoxdur;* **3.** aldatmaq, fırıldaq gəlmək; **4.** oğurlamaq; **5.** tutmaq, həbs etmək



**nobility** [nou'bılıtı] *n* **1.** alicənablıq, nəciblik, mərdlik, fədakarlıq, comərdlik; böyüklük, əzəmət, cəlal; ~ **of soul** qəlbin böyüklüyü / nəcibliyi; ~ **of features** xarici görkəmin əzəməti; **2.** zadəganlıq, əyanlıq, aristokratiya; **the** ~ *top.i* zadəganlar, aristokratlar; əyanlar

**noble$^1$** [noubl] *n* **1.** = **nobleman**; **2.** nobl *(qədim qızıl ingilis pulu)*; **3.** *amer. jarq.* ştreykbrexerlərin *(tətilə xəyanət edənlərin)* başçısı, ştreykbrexerlərin kampaniyasının nümayəndəsi

**noble$^2$** [noubl] *adj* **1.** ( **-r**; **-st**) nəcib, alicənab, mərd, əsilzadə, comərd; ~ **actions** nəcib / mərd hərəkətlər; ~ **deeds** comərd qəhrəmanlıq /hünər; **a** ~ **family** nəcib ailə; **a family of** ~ **descent** nəcib/comərd nəsildən olan ailə; **2.** böyük, əzəmətli, vüqarlı; möhtəşəm; boylu-buxunlu, qədd-qamətli; **a** ~ **building** əzəmətli / möhtəşəm bina; **3.** çox gözəl / qəşəng / yaxşı, əla; **a** ~ **horse** çox gözəl / qəşəng at; **4.** titullu, adlı-sanlı, tanınmış; ~ **blood** zadəgan/əsilzadə qanı; **to be born** ~ zadəgan / aristokrat / adlı-sanlı ailədə doğulmaq; **5.** nəcib *(metal haq.: qızıl, gümüş və s.)*; **6.** *kim.* təsirsiz *(qaz haq.)*

**nobleman** ['noublmən] *n (pl* **-men** [-mən]) **1.** aristokrat, zadəgan; əyan, ağa, kübar; **2.** titulu olan şəxs; per *(İngiltərədə, Fransada, Yaponiyada yüksək zadəgan titulu)*

**noble-minded** ['noubl'maındıd] *adj* alicənab, mərd, comərd, nəcib; əsil, əsilzadə; **a** ~ **person** alicənab / comərd /nəcib şəxs

**noble-mindedness** ['noubl'maındıdnıs] *n* mərdlik, alicənablıq, comərdlik, nəciblik, fədakarlıq

**nobleness** ['noublnıs] *n* mərdlik, alicənablıq, comərdlik, nəciblik

**noblewoman** ['noubl.wumən] *n (pl* **-women** [-wımın] **1.** aristokrat / kübar /zadəgan qadın / qız; **2.** perin arvadı / zövcəsi

**nobly** [noublı] *adv* **1.** alicənabcasına, mərdliklə, mərdcəsinə, comərdcəsinə, comərdliklə, alicənablıqla; **2.** qəhrəmancasına, fədakarcasına, fədakarlıqla; candan keçərək; **3.** əzəmətlə, vüqarla; çox yaxşı / gözəl / qəşəng, əla; ~ **proportioned edifice** çox yaxşı / əla nisbətli bina / tikili; **4.** aristokratik, zadəgan; **to** ~ **born** zadəgan mənşəli olmaq

**nobody$^1$** [noubədı] *n* cəmiyyətdə heç bir çəkisi olmayan adam; heç kimə tanış olmayan / heç kəsin tanımadığı adam; heç bir əhəmiyyəti olmayan adam; *She married a nobody O, cəmiyyətdə mövqeyi olmayan bir nəfərə ərə getdi; I knew him when he was nobody Mən onu tanıyanda o, cəmiyyətdə heç bir mövqe tutmurdu;* **a mob of nobodies** yaramazlar yığını

**nobody$^2$** [noubədı] *neg. pron (həm də* **no one** [nou wʌn]) heç kəs/kim; *Nobody was at home Evdə heç kəs yox idi; Nobody can speak English Heç kim ingiliscə danışa bilmir; He said he loved nobody but me O, dedi ki, məndən başqa heç kimi sevmirdi; I can see nobody in the garden Mən bağda heç kimi görmürəm; Nobody knows where she is now Heç kim onun indi harada olmasını bilmir*

**nocturnal** [nɔk'tə:nəl] *adj* gecə; ~ **habits** gecə həyat tərzi; ~ **bird** gecəquşu; ~ **blindness** *tib.* gecəkorluğu, şəbkorluq; ~ **animals/insects** gecə heyvanları/həşəratları *(yəni gecə fəallaşan heyvanlar, həşəratlar)*; **a** ~ **visit/trip** gecə viziti/ səyahəti

**nocturne** ['nɔktə:n] *n* noktürn *(kiçik lirik musiqi əsəri, xüs. piano üçün)*

**nod$^1$** [nɔd] *n* **1.** baş hərəkəti; başla işarə, təbrik, razılıq və s. mənasında baş əymə; **to give a** ~ başını tərpətmək *(razılıq, təbrik və s. əlaməti olaraq)*; **to be dependent on** ***smb.'s*** ~, **to be at** ***smb.'s*** ~ tamamilə bir kəsdən asılı olmaq, kor-koranə bir kəsə tabe olmaq; **2.** mürgü, mürgüləmə

**nod$^2$** [nɔd] *v* (**-dd-**) **1.** başını yırğalamaq/ tərpətmək; **to** ~ **to** ***smb.*** bir kəsə başını tərpətmək; **to** ~ **and smile at** ***smb.*** bir kəsə başını tərpətmək və gülümsəmək; **to** ~ **approval** razılıq əlaməti olaraq başını tərpətmək; *He nodded comprehension Başa düşdüyünü bildirmək üçün o, başını tərpətdi;* **2.** mürgüləmək, mürgü döymək; *He sat nodding by the fire Buxarının yanında oturub o, mürgüləyirdi / mürgü döyürdü;* **3.** ağzını açıb baxmaq; fürsəti əldən vermək /qaçırmaq; **to catch** ***smb.*** **~ding** qəfildən bir kəsin üstünü almaq; **4.** əyilmək, yellənmək *(ağac haq.)*; **5.** *məc.* dağılmaq təhlükəsində olmaq; *The empire was nodding to its fall İmperiya dağılmaq üzrə idi;*

◊ *Homer sometimes nods at. söz. Böyük adamlar da bəzən səhv edirlər*

**node** [noud] *n* **1.** *bot.* bənd, buğum *(bitkilərdə)*; **2.** kəsişmə nöqtəsi; **3.** *tib.* şiş, fır, törəmə

**nodule** ['nɔdju:l] *n* **1.** düyün; bağlama; **2.** fır, şiş *(ağacda)*

**noise$^1$** [nɔız] *n* **1.** səs, gurultu, hay-küy, səs-küy, qalmaqal; qışqırtı; *Don't make such a noise! Səs-küy salma! / salmayın!; Hold your noise! Səsini kəs!/Səsinizi kəsin!;* **2.** danışıq, söhbət, şayiə; **to make a** ~ **about** ***smth.*** bir şey haqqında səs-küy qaldırmaq; **to make a lot of** ~ **about a novel / poem, *etc.*** roman / poema və s. haqqında səs-küy qaldırmaq; *The novel made a lot of noise Bu roman çox səs-küyə səbəb oldu/səs-küy qaldırdı;* **to do *smth.* without** ~ bir işi səs-küysüz görmək; **3.** səs *(adətən xoşagəlməyən)*; gurultu, partıltı, xışıltı, xarıltı, gumbultu; **the** ~ **of the rain** yağışın səsi; *What's that noise? O nə gurultudur/xırıltıdır?*; **hammering** ~ çəkic səsi; **buzzing** ~ vızıltı səsi; **the** ~ **of the bell** zəng səsi; **the terrific** ~ **of an explosion** part-

layışın vahiməli/qorxulu səsi; **the ~ of falling leaves** tökülən yarpaqların xışıltısı; **the ~ of burning wood** yanan odunun çırtıltısı/partıltısı; 4. *arx. (böhtançı)* şayiə, qeybət, dedi-qodu; 5. *fon.* küylü səs

**noise²** [nɔɪz] *v* 1. aləmə yaymaq, car çəkmək, hamıya bildirmək; açıb söyləmək *(sirri); The scandal was noised all over the town Dedi-qodu bütün şəhərə yayıldı;* 2. səs / hay-haray salmaq, qışqırmaq, qışqırıb bağırmaq

**noiseful** [ˈnɔɪzful] *adj* səsli-küylü, gurultulu

**noiseless** [ˈnɔɪzlɪs] *adj* səssiz, səssiz-səmirsiz, sakit; ~ **typewriter** səssiz yazı makinası; **with ~ footsteps** səssiz addımlarla

**noiselessly** [ˈnɔɪzlɪslɪ] *adv* səssizcə, sakitcə, səssiz-səmirsiz; **to chatter ~** sakitcə laqqırtı vurmaq

**noisily** [ˈnɔɪzɪlɪ] *adv* 1. bərkdən, ucadan, səs-küylə; **to chatter** ~ səs-küylə/bərkdən boşboğazlıq etmək; **to eat** ~ ağzını marçıldada-marçıldada yemək; 2. səs-küylə, hay-harayla; səs sala-sala; gurultu ilə; **to walk downstairs** ~ səs-küylə aşağı enmək *(pilləkənlə)*

**noisiness** [ˈnɔɪzɪnɪs] *n* səs; səsli-küylülük, gurultu, gurultuluq; ucalıq

**noisome** [ˈnɔɪsəm] *adj* iyrənc, çox pis; ~ **smell** iyrənc iy, üfunət

**noisy** [ˈnɔɪzɪ] *adj* səsli, səs-küylü, gurultulu; ~ **games** səs-küylü oyunlar; *They say Charles Dickens didn't like noisy games in his childhood Deyirlər ki, uşaqlıqda Çarlz Dikens səs-küylü oyunları sevməzmiş;* ~ **person** səs-küylü adam; ~ **towns** səs-küylü / gurultulu şəhərlər; **a ~ welcome** səs-küylü qəbul; ~ **children** səs-küylü uşaqlar; *Stop being so noisy! Səs-küyü dayandır! / dayandırın!*

**nomad** [ˈnouməd] *n* 1. köçəri; 2. səfil, sərsəri; səyyah, yolçu; tez-tez yerini dəyişdirməyi sevən adam

**nomadic** [nouˈmædɪk] *adj* 1. köçəri; ~ **tribes** köçəri qəbilələr/tayfalar; **a ~ life** köçəri həyat; **to live / to lead a ~ life** köçəri həyat sürmək; 2. səfil, sərsəri, daimi yaşayış yeri olmayan

**nomadize** [ˈnɔmədaɪz] *v* 1. köçmək, köçərilik etmək; köçəri həyat sürmək; tez-tez yerini dəyişmək; 2. *məc.* səyahət etmək, gəzmək, gəzib dolanmaq

**nomenclature** [nouˈmenklətʃə] *n* 1. terminologiya, terminlər, istilahlar; 2. nomenklatura *(hər hansı ixtisas sahəsində işləyən adamların ümumi siyahısı)*

**nominal** [ˈnɔmɪnl] *adj* 1. adı olub özü olmayan, ancaq kağız üzərində olan, yalnız / ancaq adı olan; ~ **king** ancaq adı olan / formal kral; *The peace was nominal, for border clashes continued Sülh ancaq kağız üzərində idi, əslində sərhəd toqquşmaları davam edirdi;* ~ **and real wages** nominal və real əmək haqları; 2. cüzi, çox kiçik/az/əhəmiyyətsiz, dəyərsiz, heç bir dəyəri olmayan; şərti, simvolik, nominal; ~ **rent** çox az /aşağı mənzil kirayəsi; ~ **price** simvolik / çox aşağı / nominal qiymət; ~ **value** nominal dəyər; ~ **capital** nominal / əsas kapital; 3. *qram.* adlıq; ~ **sentence** adlıq cümlə

**nominalizm** [ˈnɔmɪnəlɪzm] *n fəls.* nominalizm *(yalnız ayrı-ayrı şeylərin mövcud olduğunu, ümumi məfhumların isə onlardan başqa bir şey olmadığını iddia edən fəlsəfi cərəyan)*

**nominalist** [ˈnɔmɪnəlɪst] *n fəls.* nominalist *(nominalizm tərəfdarı)*

**nominate** [ˈnɔmɪneɪt] *v* 1. namizəd göstərmək, namizədliyini irəli sürmək *(vəzifəyə, seçkidə və s.)*; **to ~ *smb.* for the Presidency** bir kəsi prezidentliyə namizəd irəli sürmək; 2. təyin etmək; **to ~ *smb.* to / for a post** bir kəsi vəzifəyə təyin etmək / qoymaq; **a board of six ~ed and six elected members** altısı təyin edilmiş və altısı seçilmiş idarə heyəti; *He was nominated to speak on our behalf O, bizim adımızdan danışmaq üçün təyin edilmişdi; The board nominated her as the new director İdarə heyəti onu yeni / təzə direktor təyin etdi; December 1st has been nominated as the day of the election 1 dekabr seçki günü təyin edilib*

**nomination** [ˌnɔmɪˈneɪʃn] *n* 1. göstərilmə, namizədliyini irəli sürmə *(seçkilərdə, vəzifəyə qoymaq üçün)*; **to put in** ~ namizədliyi irəli sürmək; 2. təyin etmə *(vəzifəyə)*

**nominative¹** [ˈnɔmɪnətɪv] *n qram.* adlıq hal; *Use this noun in the nominative Bu ismi adlıq halda işlət / işlədin*

**nominative²** [ˈnɔmɪnətɪv] *adj* 1. *qram.* adlıq; ~ **sentence** adlıq cümlə; 2. təyin edilmiş *(vəzifəli adam haq.)*

**nominator** [ˈnɔmɪneɪtəʳ] *n* namizədi irəli sürən və ya vəzifəyə təyin edən şəxs

**nominee** [ˌnɔmɪˈniː] *n* 1. namizəd *(seçkidə müəyyən vəzifəyə irəli sürülən); Our nominee has been elected Bizim namizədimiz seçilib*; 2. *tic.* müəyyən kompaniyada adına pul qoyulmuş adam / şəxs

**non-** [nɔn-] *pref. isimlərin, sifətlərin və zərflərin düzəldilməsində iştirak edir:* **non-sense** mənasızlıq; **non-alcoholic** alkoqolsuz; **non-profit-making** qazanc gətirməyən; **non-committally** qeyri-müəyyən, ikimənalı

**non-ability** [ˌnɔnəˈbɪlɪtɪ] *n* qabiliyyətsizlik, bacarıqsızlıq; acizlik

**non-absorbable** [ˈnɔnəbˈsɔːbəbl] *adj* canına çəkməyən, hopdurulmayan

**nonage** [ˈnounɪdʒ] *n* 1. *hüq.* həddi-büluğa çatmama; **to be still in *one's* ~** hələ həddi-büluğa çatmamaq; 2. gənclik; **riotous ~** çılğın gənclik; 3. *məc.* yetişməmə; **spiritual ~** mənəvi *(cəhətdən)* yetişməmə



**nonagenarian¹** [ˌnounədʒɪˈneərɪən] *n* doxsanyaşlı qoca; doxsanla yüz yaş arasında olan adam

**nonagenarian²** [ˌnounədʒɪˈneərɪən] *adj* doxsanyaşlı, yaşı doxsandan çox olan

**non-agression¹** [ˌnɔnəgˈreʃn] *n siya.* hücum etməmə

**non-agression²** [ˌnɔnəgˈreʃn] *adj:* ~ **pact** hücum etməmə haqqında müqavilə; **a ~ policy** hücum etməmə siyasəti

**non-alcoholic** [ˌnɔnælkəˈhɔlɪk] *adj* alkoqolsuz, spirtsiz; ~ **drinks** alkoqolsuz içkilər; ~ **large** spirtsiz / alkoqolsuz pivə

**non-aligned** [ˌnɔnəˈlaɪnd] *adj siya.* daxil olmayan, qoşulmayan *(bloklara)*; bitərəf; ~ **nations** bloklara daxil olmayan /bitərəf ölkələr

**non-alignment** [ˌnɔnəˈlaɪnmənt] *n siya.* bloklara qoşulmama siyasəti, bloka qoşulmama; bitərəflik; **a policy of ~** bitərəflik siyasəti, bloklara qoşulmama siyasəti

**non-appearance** [ˌnɔnəˈpɪərəns] *n* gəlməmə *(məhkəməyə, yarışa və s.)*

**non-arable** [ˌnɔnˈærəbl] *adj* əkinə yararsız *(torpaq haq.)*

**non-arrival** [ˌnɔnəˈraɪvl] *n* gəlməmə; daxil olmama

**non-attendance** [ˌnɔnəˈtendəns] *n* gəlməmə *(dərsə və s.); The chairman received three apologies for non-attendance at the meeting İclasa gəlmədiyinə görə üç nəfər sədrdən üzr istədi*

**nonbearing** [ˌnɔnˈbeərɪŋ] *adj k.t.* bar/məhsul verməyən, barsız, bəhərsiz

**non-believer** [ˌnɔnbɪˈliːvəʳ] *n* 1. dinə / Allaha inanmayan; dinsiz, ateist; 2. skeptik *(hər şeydən şübhələnən adam)*

**nonce-word** [ˈnɔnswəːd] *n dilç.* ancaq müəyyən sahədə işlənən söz

**nonchalance** [ˈnɔnʃələns] *n* 1. qayğısızlıq, qeydsizlik, başısoyuqluq; 2. etinasızlıq, laqeydlik; *He received the trophy with surprising nonchalance O, prizi heyrət doğuracaq laqeydliklə aldı*

**nonchalant** [ˈnɔnʃələnt] *adj* 1. qayğısız, qəmsiz, qeydsiz, dərdsiz, fikirsiz; **to try to look ~** qayğısız / qəmsiz / dərdsiz görünməyə çalışmaq; 2. səhlənkar, başısoyuq; laqeyd; ~ **attitude** laqeyd münasibət; **to be ~ about *smth.*** bir şeyə laqeyd qalmaq, bir şeyə laqeyd yanaşmaq

**nonchalantly** [ˈnɔnʃələntlɪ] *adv* 1. qayğısız, qayğısızcasına; 2. laqeydcəsinə, laqeydliklə; ~ **lighting a cigarette** siqareti laqeydcəsinə yandırma

**nonclassified** [ˈnɔnˈklæsɪfaɪd] *adj* gizli/ məxfi olmayan, qeyri-məxfi *(məlumat haq.)*; qrifsiz *(sənəd haq.)*

**non-coherent** [ˌnɔnkouˈhɪərənt] *adj* 1. əlaqəsiz, qırıq-qırıq, rabitəsiz, dolaşıq, qarışıq, bir-birinə uyuşmayan *(fikir, nitq haq.)*; 2. yumşaq, boş *(torpaq və s. haq.)*; ~ **soil** *k.t.* yumşaq / boş torpaq

**non-combatant** [ˌnɔnˈkɔmbətənt] *n hərb.* qeyri-sıravi əsgər / çavuş /zabit/ cəbhədə bilavasitə iştirak etməyən hərbi qulluqçu *(məs. hərbi həkim və s.)*

**noncommercial** [ˌnɔnkəˈməːʃəl] *adj* satış üçün olmayan / hazırlanmayan; ~ **publication** satışa qoyulmayan / satış üçün çap olunmayan nəşr

**noncommittal¹** [ˌnɔnkəˈmɪtl] *n* ikimənalılıq

**noncommittal²** [ˌnɔnkəˈmɪtl] *adj* qeyri-müəyyən, qeyri-səmimi, ikimənalı; **a ~ reply** qeyri-müəyyən / ikimənalı cavab; **a ~ letter** ikimənalı məktub; **a ~ attitude** qeyri-müəyyən münasibət; *She was very noncommittal about my suggestion Mənim təklifimə onun münasibəti ikimənalı idi; I'll be quite noncommittal Mən heç bir qəti cavab verməyəcəm*

**non-compliance** [ˌnɔnkəmˈplaɪəns] *n* 1. tabe olmama, itaətsizlik, boyun əyməmə; ~ **with orders** *hərb.* əmri yerinə yetirməmə; əmrə tabe olmama; 2. **(with)** razı olmama, razılaşmama; ixtilaf; 3. uyğun gəlməmə, müvafiq olmama, düz gəlməmə; uyğunsuzluq; 4. riayət etməmə *(qayda-qanuna, müqaviləyə)*

**nonconformism** [ˌnɔnkənˈfɔːmɪzm] *n* = **nonconformity**

**nonconformist¹** [ˌnɔnkənˈfɔːmɪst] *n* 1. *kils.* disident; mürtəd *(hakim dindən ayrılmış şəxs)*; sektant *(təriqətçi)*, təfriqəçi, təfriqə/nifaq/ikitirəlik salan adam; 2. konformist, şəxsi-qərəzlik edən / narazılıq edən adam; buntçu; qiyamçı, üsyankar adam

**nonconformist²** [ˌnɔnkənˈfɔːmɪst] *adj* 1. *kils.* mürtəd; sektant *(təriqətçi)*, təfriqəçi; 2. ənənəni qəbul etməyən, itaətsiz, üsyankar

**nonconformity** [ˌnɔnkənˈfɔːmɪtɪ] *n* 1. *(to, with)* tabe olmama *(qaydaya, qayda-qanuna və s.)*, riayət etməmə, gözləməmə *(qaydanı və s.)*; ~ **to the usual ways of dressing** adi geyim qaydalarına riayət etməmə; 2. uyğun gəlməmə / olmama; 3. *top.i kils.* mürtədlər *(hakim dindən ayrılmışlar)*

**non-cooperation** [ˌnɔnkouˌɔpəˈreɪʃn] *n* 1. əməkdaşlıqdan imtina etmə, bir yerdə işləməkdən boyun qaçırma; 2. *siya.* boykot siyasəti; vətəndaşlıq itaətsizliyi

**nondescript** [ˈnɔndɪskrɪpt] *adj* çətin fərqləndirilən; təsvir olunmayan; **to wear ~ gray clothes** çətin fərqləndirilən boz paltar geymək; **a ~ landscape /face /voice** çətin fərqləndirilən mənzərə/sifət/səs; **a section of ~ row houses** birtipli evlərdən ibarət məhəllə

**non-dissemination** [ˈnɔndɪˌsemɪˈneɪʃn] *n* atom silahının yayılmasından imtina etmə; atom silahını başqa ölkələrə verməmə haqqında təəhhüd / öhdəlik

**non-durable** [ˌnɔnˈdjuərəbl] *adj* az ömürlü, ömrüaz, ömrü qısa; ömrü az olan

**none¹** [nʌn] *indef. pron (Həm tək, həm də cəm fellə işlənir)* 1. heç bir, heç kəs/kim; ~ **of them** onlardan heç biri; *None of them was / were there Onlardan heç biri / heç kəs orada yox idi; None of them was / were German Onlardan heç biri*

*alman deyildi; None of them could help us Onlardan heç biri bizə kömək edə bilmədi; I saw none of the people I wanted Mən istədiyim adamlardan heç kimi / kəsi orada görə bilmədim;* **2.** *heç, heç bir, heç nə; I want none of these books Mən bu kitablardan heç birini istəmirəm; None of this concerns me Bunların mənə dəxli yoxdur;* **3.** heç, bir az da olsa, zərrə qədər də olsa, qətiyyən; *She had none of her mother's beauty Onda anasının gözəlliyindən bir az da olsa / zərrə qədər də olsa yox idi;* **4.** *(Elliptik cümlələrdə işlənir) You have a lot of money and I have none Sənin / Sizin çoxlu pulun / pulunuz var, mənim isə heç yoxdur;*

◊ ~ **but** ancaq; *I want none but fresh eggs Mən ancaq təzə yumurta istəyirəm; None of your business! Sənə / Sizə dəxli yoxdur!; None of your impudence Ədəbsizlik etmə! / etməyin!*

**none[2]** [nʌn] *adv* **1.** *(Əsasən* **too, so** *sözləri qarşısında işlənir)* əsla / qətiyyən yox, əsla, qətiyyən; *None so good Əsla yaxşı deyil; He was looking none too pleased O, qətiyyən razı görünmürdü;* **2.** *(Müəyyənlik artikli və müqayisə dərəcəsində olan sifətlə, zərflə işlədilir);* əsla, qətiyyən; *He is none the happier for his wealth O, var-dövlətinə görə əsla xoşbəxt deyil;* **3.** *amer.* heç -ma/mə; *I slept none last night Mən keçən gecə heç yatmadım*

**nonentity** [nɔ'nentɪtɪ] *n* **1.** heç bir əhəmiyyəti olmayan adam; yaramaz adam; *How could such a nonentity become chairman of the company? Belə bir yaramaz adam necə kompaniyanın sədri ola bildi?;* **2.** mövcud olmayan şey, uydurma, təxəyyülün məhsulu

**non-essential** ['nɔnɪ'senʃl] *adj* ikinci dərəcəli, boş, son dərəcə mənasız, cəfəng; ~ **matters** ikinci dərəcəli məsələlər

**nonetheless** [.nɔnðəles] *adv* bununla belə/yanaşı, hər halda

**non-existence** [.nɔnɪg'zɪstəns] *n* **1.** mövcud olmayan bir şey; **2.** *fəls.* yoxluq, olmama, mövcud olmama

**non-existent** [.nɔnɪg'zɪstənt] *adj* mövcüd olmayan; **a ~ danger /problem /threat** mövcud olmayan təhlükə/problem/hədə; *This is non-existent to him Belə şey onda yoxdur*

**non-fiction** [.nɔn'fɪkʃn] *n* sənədli/elmi ədəbiyyat

**non-fictional** [.nɔn'fɪkʃənl] *adj* sənədli *(povest, film haq.)*, faktiki

**non-flamable** [.nɔn'flæməbl] *adj* yanmayan, alışmayan, alovlanmayan; ~ **pyjamas for children** uşaqlar üçün yanmayan parçadan tikilmiş pijama *(yüngül parçadan tikilmiş yataq və ev paltarı)*

**non-freezing** [.nɔn'fri:zɪŋ] *adj* donmayan; şaxtayadavamlı

**non-interference** [.nɔnɪntə'fɪərəns] *n* qarışmama *(başqa dövlətin daxili işlərinə);* ~ **in domestic affairs** daxili işlərə qarışmama



**non-intervention** [.nɔn'ɪntə:venʃn] *n siya.* qarışmama

**no-no** ['nou nou] *n* qadağan/yasaq olunan şey; *Smoking in this house is a no-no Bu evdə papiros çəkmək qadağandır/yasaqdır*

**non-observance** ['nɔnəb'zə:vəns] *n* riayət etməmə *(qaydaya və s.)*; yerinə yetirməmə *(əmri)*; qanun pozuntusu

**non-official** [.nɔnə'fɪʃəl] *adj* qeyri-rəsmi; ~ **report** qeyri-rəsmi məlumat

**non-partisan** [.nɔn.pa:tɪ'zæn] *adj* **1.** partiya üzvü olmayan, bitərəf; ~ **ballot** *amer.* namizədlərin partiya mənsubiyyətinin göstərilmədiyi bülleten; **2.** qərəzsiz, tərəfgirlik etməyən, üzgörməyən

**non-party** [.nɔnpa:tɪ] *adj* bitərəf, partiyasız, partiyada olmayan

**non-payment** [.nɔn'peɪmənt] *n* ödəməmə, verməmə, ödəniləcək pulu vaxtında verməmə / ödəməmə

**non-permanent** [.nɔn'pə:mənənt] *adj* dəyişkən, dəyişən, qeyri-sabit; ~ **members of the Security Council** Təhlükəsizlik Şurasının dəyişən üzvləri

**non-plus[1]** [.nɔn'plʌs] *n* pozğunluq, qarışıqlıq; özünü itirmə, çaşma, karıxma; çətin vəziyyət; **at a ~** çıxılmaz vəziyyətdə; **to put /to bring /to drive to a ~** çaşdırmaq, çətin vəziyyətə salmaq

**non-plus[2]** [.nɔn'plʌs] *v* çaşdırmaq, çətin / çıxılmaz vəziyyətə salmaq; *This question nonplused the candidates Bu sual namizədləri çətin vəziyyətə saldı / çaşdırdı*

**nonpolitical** [:nɔnpə'lɪtɪkəl] *adj* **1.** siyasi həyatda iştirakdan boyun qaçıran, siyasətlə məşğul olmayan; **2.** heç bir partiyaya qoşulmayan, siyasi mübarizədə iştirak etməyən; **to appoint a ~ commission** heç bir partiyaya mənsub olmayan üzvlərdən komissiya yaratmaq

**non-productive** [.nɔnprə'dʌktɪv] *adj* **1.** istehsal etməyən; ~ **personal** istehsalla məşğul olmayan adamlar / qulluqçular; **2.** *gram.* qeyri-məhsuldar; ~ **suffixes** qeyri-məhsuldar şəkilçilər

**non-profit-making** [.nɔn'prɔfɪtmeɪkɪŋ] *adj* qeyri-ticarət; ~ **organizations** qeyri-ticarət təşkilatlar

**non-profit** [.nɔn'prɔfɪt] *adj* gəlir üçün nəzərdə tutulamyan; qeyri-ticarət; ~ **organization** *amer.* ictimai təşkilat *(xeyriyyəçiliklə məşğul olan və s.)*

**non-provided** [.nɔnprə'vaɪdɪd] *adj* yerli büdcə ilə təmin edilməyən *(məktəb haq.)*

**non-recognition** ['nɔn.rekəg'nɪʃn] *n siya.* tanımama *(dövləti)*

**nonsense** ['nɔnsens] *n* **1.** cəfəngiyyat, boş / mənasız / axmaq söz, uydurma; **to talk ~** cəfəngiyyat / mənasız söz danışmaq; **a piece of ~** boş / mənasız söhbət, mənasızlıq, mənasız söz; *His theory is a piece of nonsense Onun nəzəriyyəsi*



*mənasız bir şeydir / cəfəngiyyatdır; It's nonsense to think that... Belə fikirləşmək axmaqlıqdır ki,...; You're talking nonsense Sən / Siz cəfəngiyyat danışırsan / danışırsınız;* **2.** ağılsız hərəkət/iş, axmaq davranış / hərəkət; *Stop that nonsense, children! Uşaqlar, bu axmaq hərəkəti buraxın!; He will stand no nonsense O, belə axmaq hərəkətlərə dözməz;*

◊ **to make a ~ of** ***smth.*** bir şeyin dəyərini / mənasını heçə endirmək; *This discovery makes a nonsense of all previous theories Bu kəşf əvvəlki bütün nəzəriyyələri heçə endirir*

**nonsensical** [.nɔn'sensɪkl] *adj* mənasız, cəfəng; **a ~ suggestion** cəfəng/boş/ mənasız təklif

**nonsensically** [.nɔn'sensɪklɪ] *adv* boş, boş-boş, cəfəng, mənasız; **to speak ~** boş / cəfəng / boş-boş danışmaq

**non-sensitive** [.nɔn'sensɪtɪv] *adj* **1.** qeyri-həssas, həssas olmayan, duyğusuz, hissiz; duyulmayan, hiss olunmayan; **2.** müdafiə əhəmiyyəti olmayan; xarici kəşfiyyat üçün maraq doğurmayan; ~ **areas** gizli hesab edilməyən sahələr *(elm və s. haq.)*

**non-slip** [.nɔn'slɪp] *adj* sürüşməyən, sürüşkən olmayan

**non-smoker** [.nɔn'smoukə^r] *n* **1.** papiros çəkməyən; **2.** papiros çəkməyənlər üçün vaqon və ya kupe *(sərnişin vaqonunda)*

**non-standard** [.nɔn'stændəd] *adj dilç.* ümumi qaydaya müvafiq olmayan, qeyri-standart, standart olmayan; ~ **English** qeyri-standart ingilis dili

**non-stick** [.nɔn'stɪk] *adj* yapışmayan *(səth, qazan və s. haq.)*; **a ~ frying-pan** yapışmayan tava

**non-stop[1]** [.nɔn'stɔp] *adj* dayanmadan, birbaşa *(qatar, təyyarə və s. haq.);* **a ~ flight to Tokyo** Tokiyoya birbaşa uçuş

**non-stop[2]** [.nɔn'stɔp] *adv* birbaşa, dayanmadan, fasiləsiz, arasıkəsilmədən; **to fly ~** birbaşa uçmaq; **to talk ~** dayanmadan danışmaq

**non-toxic** [.nɔn'tɔksɪk] *adj* zəhərsiz, zəhərləməyən, zəhəri olmayan

**non-transportable** [.nɔntræns'pɔ:təbl] *adj* daşınmayan, bir yerdən başqa yerə aparıla bilməyən *(xəstə və s. haq.)*

**non-union** [.nɔn'ju:nɪən] *adj* **1.** həmkarlar təşkilatına üzv olmayan; ~ **workers** həmkarlar təşkilatına üzv olmayan fəhlələr; **2.** həmkarlar təşkilatına üzv olmayan *(kompaniya, fabrik və s.);* **a ~ factory** həmkarlar təşkilatına üzv olmayan fabrik

**non-unionism** [.nɔn'ju:njənɪzm] *n* həmkarlar təşkilatı əleyhinə siyasət

**non-unionist** [.nɔn'ju:njənɪst] *n* **1.** həmkarlar təşkilatının üzvü olmayan; **2.** həmkarlar təşkilatının əleyhdarı

**non-violence** [.nɔn'vaɪələns] *n* güc işlətmə siyasətindən imtina etmə, güc işlətməmə siyasəti; **Gandi's policy of ~** Qandinin güc işlətməmə siyasəti



**non-violent** [.nɔn'vaɪələnt] *adj* dinc, güc işlətməmə; **a ~ demonstration** dinc nümayiş

**noodle[1]** [nu:dl] *n* **1.** *(adət. cəmdə işlənir)* əriştə; *Chinese food is often served with rice or noodle Çin yeməkləri çox vaxt düyü və ya əriştə ilə verilir;* **2.** *jarq.* axmaq, sərsəm

**noodle[2]** [nu:dl] *adj* əriştə; ~ **soup** əriştə supu / şorbası

**nook** [nuk] *n* **1.** xəlvət /sakit /gizli guşə; sığınacaq, daldalanacaq; **a peaceful ~ in the country** kənddə sakit yer; **a shady ~ in the garden** bağda kölgəli bir sakit guşə; **to sit in a cosy ~ by the fire** buxarının yanında rahat bir küncdə oturmaq; **2.** uzaq sakit yer; künc-bucaq, ucqar /mədəni mərkəzdən uzaq yer; **a ~ yet untroubled by the tourist** turistlərin ayağı dəyməmiş yer; turistlərin korlamadığı yer;

◊ **every ~ and cranny** hər tərəfdən / yerdən; *The wind blew into every nook and cranny Külək hər tərəfdən / hər yerdən içəri əsirdi*

**noon[1]** [nu:n] *n* günorta; *The library closes at noon on Saturdays Şənbə günləri kitabxana günorta bağlanır; The conference opens at twelve noon Konfrans günorta saat on ikidə açılır;* **to sleep until ~** günortaya qədər yatmaq; **the sun at ~** günorta günəşi; günorta yerində olan günəş;

◊ **the ~ of** ***one's*** **life** həyatının ən yaxşı/oğlan çağı

**noon[2]** [nu:n] *adj* günorta; ~ **meal** günorta yeməyi; ~ **recess** böyük tənəffüs *(məktəbdə)*

**noonday[1]** ['nu:ndeɪ] *n* **1.** günorta, günün ortası; **2.** *məc.* çiçəklənmə; zirvə, çağ; **the ~ of** ***one's*** **life** ömrün çiçəklənmə dövrü / çağı; *He was at the noonday of his life O, ömrünün çiçəklənmə dövründə / çağında idi*

**noonday[2]** ['nu:ndeɪ] *adj* günorta; **the ~ sun** günorta günəşi; **to sit in the ~ sun** günorta günəşi altında oturmaq

**noose[1]** [nu:s] *n* **1.** ilgək, ilmə; **2.** kəmənd; **3.** ər-arvadlıq əlaqələri; **4.** *məc.* tələ; kələk, hiylə; **a hanging man's ~** dar ağacı; **to tighten the ~ around** ***smb.'s*** **neck** bir kəsin boğazını kəməndə /ilməyə salmaq, bir kəsi asmaq;

◊ **to put** ***one's*** **neck in the ~** öz əlilə boğazına kəndir salmaq, öz əlilə boğazını ilməyə keçirmək

**noose[2]** [nu:s] *v* **1.** kəməndlə tutmaq; **2.** *məc.* bağlamaq; kəməndə salmaq; tələyə salmaq; **to ~ oneself** əl-qolunu bağlamaq *(andla və s.);* **3.** asmaq *(adamı);* **4.** ilmə / ilgək bağlamaq; **to ~ a rope** kəndiri ilmə / ilgək bağlamaq

**nope** [noup] *adv amer. jarq.* yox, xeyr; *-Have you seen my pen? -Nope Mənim qələmimi görmüsənmi?/görmüsünüzmü? -Yox / Xeyr*

**noplace** ['noupleɪs] *adv amer. d.d.* heç yerdə; *I could find him noplace Mən onu heç yerdə tapa bilmədim*

**nor** [nɔ:^r] *conj* **1.** ( **neither** *sözündən sonra işlənir*

*və onunla birlikdə Azərbaycan türkcəsinə* **nə... nə də** *birləşməsi ilə tərcümə edilir); I've neither the time nor the patience to listen to his complaints Mənim onun şikayətinə qulaq asmağa nə vaxtım (var), nə də hövsələm; Just warm, neither cold nor hot Sadəcə olaraq ılıqdır, nə soyuqdur, nə də isti;* **2.** ...da, ...də; *-I don't want to work today -Nor do I -Mən bu gün işləmək istəmirəm -Mən də; We don't want to go to the cinema, nor does she Biz bu gün kinoya getmək istəmirik, o da*

**Nordic** ['nɔ:dɪk] *adj* Skandinaviya; ~ **languages** Skandinaviya dilləri

**norm** [nɔ:m] *n* **1.** norma; qayda, qanun; qayda-qanun, nizam, nizam-intizam; **departure from the ~** normadan/ qaydadan / qayda-qanundan kənara çıxma; **cultural ~s** mədəni qaydalar; **social ~s** ictimai qaydalar / qayda-qanunlar; **2.** nəzərdə tutulan / gözlənilən miqdar, gözlənilən davranış /davranış norması; *The national norm in this examination is 70 out of 100 Bu yoxlamada dövlətin nəzərdə tutduğu norma 100-də 70-dir*

**normal[1]** ['nɔ:məl] *n* **1.** normal vəziyyət; **2.** normal nümunə / ölçü; **3.** *kim.* normal məhlul; **4.** *riyaz.* normal *(toxunma nöqtəsində toxunana perpendikulyar olan düz xətt);* **5.** *tib.* normal temperatur / hərarət; **6.** *toxuc.* yarımyun trikotaj *(maşında toxunmuş parça)*

**normal[2]** ['nɔ:məl] *adj* **1.** normal; adi, həmişəki; **pulse ~ for a person's age** insanın yaşına uyğun nəbz; ~ **winter weather** adi qış havası; ~ **working hours** normal iş saatı; ~ **temperature** normal/ adi temperatur; **a ~ child** normal uşaq; **2.** standart; ~ **conditions** *tex.* standart iş şəraiti;

◊ ~ **school** pedaqoji məktəb

**normalcy** ['nɔ:məlsɪ] *n amer.* = **normalty**

**normality** [nɔ:'mælɪtɪ] *n* **1.** normallıq, normal vəziyyət; **2.** normaya / standarta uyğunluq

**normalization** [,nɔ:məlaɪ'zeɪʃn] *n* **1.** normallaşdırma; qaydaya salma, yoluna qoyma, nizama salma; **the ~ of relations** əlaqələri normallaşdırma; **2.** normaya salınma, standartlaşma

**normalize** ['nɔ:məlaɪz] *v* normaya salmaq, normallaşdırmaq, müəyyən normaya salmaq *(ölkə daxilində vəziyyəti və s.);* **to ~ trading relations** ticarət əlaqələrini normaya / qaydaya salmaq

**normally** ['nɔ:məlɪ] *adv* **1.** normal, normal olaraq / tərzdə; **to speak ~** normal tərzdə danışmaq; **2.** adətən, bir qayda olaraq; *I normally go to bed early, but I stayed up late last night Mən adətən tez yatıram, amma dünən gecə gec yatdım*

**Norman[1]** ['nɔ:mən] *n* **1.** normandiyalı; **2.** norman *(orta əsrlərdə Skandinaviyada sakin olmuş tayfanın adı);* **3.** *dilç.* fransız dilinin norman dialekti

**Norman[2]** ['nɔ:mən] *adj* Normandiya; **the ~ Conquest** İngiltərənin Normanlar tərəfindən işğal edilməsi *(1066-cı ildə)*

**normative** ['nɔ:mətɪv] *adj* normativ; **a ~ grammar** normativ qrammatika; ~ **argument** normativ dəlil

**north[1]** [nɔ:θ] *n* **1.** şimal, quzey; **geographic /true ~** coğrafi/əsl şimal; **to overlook the ~** şimala / quzeyə baxmaq *(pəncərə və s.haq.);* **a window facing the ~** şimala baxan pəncərə; *I'm lost; which direction is north? Mən azmışam; şimal hansı səmtdədir?;* **2.** şimaldan əsən külək; **a cold ~** soyuq şimal küləyi; **3.** ölkənin şimal/quzey hissəsi; **the North of Japan ~** Yaponiyanın şimal hissəsi / şimali

**north[2]** [nɔ:θ] *adj* **1.** şimal, quzey; ~ **wind** şimal/quzey küləyi; **2.** qütb, şimal; **North Star ~** qütb / şimal ulduzu; **3.** şimali; North America Şimali Amerika; **4.** şimala baxan / açılan; ~ **window** şimala baxan / açılan pəncərə

**north[3]** [nɔ:θ] *adv* şimala, quzeyə, şimal / quzey tərəfə, şimal/quzey istiqamətə; **to travel ~** şimal istiqamətində getmək; **to sail ~** şimala tərəf üzmək, şimal istiqamətində üzmək; *Scotland lies north of England Şotlandiya İngiltərənin şimalında yerləşir*

**north-bound** ['nɔ:θ'baund] *adj* şimala / şimal istiqamətində gedən *(qatar və s. haq.)*

**north-east[1]** ['nɔ:θ'i:st] *n* **1.** şimal-şərq; **2.** *şair.* şimal-şərq küləyi

**north-east[2]** ['nɔ:θ'i:st] *adj* şimal-şərq

**north-east[3]** ['nɔ:θ'i:st] *adv* şimal-şərqə *(tərəf)*

**northeaster** ['nɔ:θi:stər] *n* güclü şimal-şərq küləyi

**north-easterly[1]** ['nɔ:θ'i:stəlɪ] *adj* **1.** şimal-şərq, şimal-şərqdə yerləşən; ~ **direction** şimal-şərq istiqaməti; **2.** şimal-şərqdən əsən *(külək haq.)*

**north-easterly[2]** ['nɔ:θ'i:stəlɪ] *adv* **1.** şimal-şərqə, şimal-şərq istiqamətində; **2.** şimal-şərqdən, şimal-şərq tərəfdən *(külək haq.)*

**north-eastern** ['nɔ:θ'i:stən] *adj* şimal-şərq; ~ **wind** şimal-şərq küləyi

**north-eastward[1]** ['nɔ:θ'i:stwəd] *n* şimal şərq

**north-eastward[2]** ['nɔ:θ'i:stwəd] *adj* şimal-şərq; ~ **wind** şimal-şərq küləyi; şimal-şərq istiqamətində gedən / hərəkət edən, şimal-şərqdə yerləşən

**north-eastward[3]** ['nɔ:θ'i:stwəd] *adv* şimal-şərqə, şimal-şərq istiqamətində

**northerly[1]** ['nɔ:ðəlɪ] *adj* şimal, quzey; ~ **wind** şimal küləyi; ~ **direction** şimal istiqaməti; **the ~ shore of the lake** gölün şimal / quzey sahili; **a cold ~ wind** soyuq şimal küləyi

**northerly[2]** ['nɔ:ðəlɪ] *adv* şimala, şimal istiqamətində; **to travel ~** şimala/şimal istiqamətində getmək

**northern[1]** ['nɔ:ðən] *n* şimallı, şimalda yaşayan

**northern[2]** ['nɔ:ðən] *adj* **1.** şimal, şimala aid olan; **the Northern Hemisphere** şimal yarımkürəsi;



~ **lights** şimal parıltısı; **2.** şimaldan / quzeydən əsən *(külək haq.);*

◊ **the Northern Bear** *kin.* şimal ayısı *(Rusiya haq.)*

**northerner** [nɔ:ðənər] *n* şimallı, şimalda yaşayan

**north-west[1]** ['nɔ:θ'west] *n* şimal-qərb

**north-west[2]** [nɔ:θ'west] *adj* şimal-qərb; ~ **regions** şimal-qərbdə yerləşən rayonlar

**north-west[3]** ['nɔ:θ'west] *adv* **1.** şimal-qərbə, şimal-qərbə doğru, şimal-qərb istiqamətində; **2.** şimal-qərbdə; **3.** şimal-qərbdən əsən külək

**north-wester** ['nɔ:θ'westər] *n* şimal-qərbdən əsən güclü külək, şimal-qərbdən gələn tufan

**north-westerly** ['nɔ:θ'westəlɪ] *adj* **1.** şimal-qərb, şimal-qərbdə yerləşən; ~ **direction** şimal-qərb istiqaməti; **2.** şimal-qərbdən əsən *(külək haq.)*

**north-western** ['nɔ:θ'westən] *adj* şimal-qərb; ~ **wind** şimal-qərb küləyi

**north-westward[1]** ['nɔ:θ'westwəd] *n* şimal-qərb

**north-westward[2]** ['nɔ:θ'westwəd] *adj* şimal-qərb, şimal-qərbə istiqamət alan, şimal-qərbdə yerləşən

**Norwegian[1]** [nɔ:'wi:dʒən] *n* norveçli; **the ~s** *top.i* norveçlilər, norvegiyalılar

**Norwegian[2]** [nɔ:'wi:dʒən] *adj* Norveç; **the ~ language** Norveç dili; ~ **parliament** Norveç parlamenti

**nose[1]** [nouz] *n* **1.** burun; **to speak through one's / the ~** burnunda danışmaq; *Stop picking your nose! Burnunu / Burnunuzu eşələmə! / eşələməyin!; Keep your (big) nose out of my affairs! Burnunu / Burnunuzu mənim işimə soxma! / soxmayın!;* **2.** iybilmə qabiliyyəti; iy duyğusu, duyma qabiliyyəti *(heyvanlarda);* **a dog with a good ~** yaxşı iybilmə qabiliyyəti olan it; **3.** burun, ön hissə *(gəmidə, təyyarədə və s.); He brought the plane's nose up and made a perfect landing O, təyyarənin burnunu yuxarı qaldırdı və rahatca yerə endi;*

◊ **to blow one's ~** burnunu silmək / təmizləmək; **to get up smb.'s ~** bir kəsi özündən çıxartmaq / narahat etmək; *Her remarks really got up my nose! Onun iradları həqiqətən məni özümdən çıxartdı;* **to have one's ~ in smth.** bir işi çox böyük maraqla görmək; *Peter's always got his nose in a book Pyotr kitabı həmişə böyük maraqla oxuyur;* **on the ~** gözündən, dəqiq, düz; *You've hit it on the nose Sən/Siz düz başa düşmüsən/ düşmüsünüz;* **to poke / to stick one's ~ into smth.** burnunu bir şeyə soxmaq *(yəni bir kəsin işinə qarışmaq);* **with one's ~ in the air** özünü dartaraq, burnunu dik tutaraq; *She walked straight past us with her nose in the air O, bizim yanımızdan burnunu dik tutaraq ötüb keçdi*

**nose[2]** [nouz] *v* **1.** iyləmək, imsiləmək; *The dog was nosing my boots İt mənim çəkmələrimi iyləyirdi / imsiləyirdi; The dog was nosing everywhere İt hər yeri imsiləyirdi;* **2.** *məc.* sezmək, duymaq; **to ~ danger** təhlükəni sezmək / duymaq; **3.** iylə tapmaq; iyləyib tapmaq; *The dog nosed out a rat İt iyləyib siçovul tapdı;* **4.** burnu ilə itələyib açmaq; *The dog nosed the door open İt qapını burnu ilə itələyib açdı;* **5.** **(for, after)** axtarmaq, axtarıb tapmaq *(bir kəsi / şeyi)*

**nosebag** ['nouzbæg] *n* **1.** torba, kisə *(içində yemək olan və atın başına taxılan);* **2.** *jarq.* səhər yeməyi *(fəhlələrin özü ilə işə apardığı);*

◊ **to put on the ~** yemək, qəlyanaltı etmək *(xüs. işdə)*

**noseband** ['nouzbænd] *n* alınlıq *(yüyənin və ya cilovun alın qayışı)*

**nose-bleed** ['nouzbli:d] *n* **1.** burundan qanaxma; **to have a ~** burnundan qan axmaq, burnu qanamaq; **2.** *bot.* boymadərən, qanotu

**nosedive[1]** ['nouzdaɪv] *n* **1.** *av.* sərt şığıma; **2.** *məc.* kəskin surətdə enmə / düşmə / azalma; *Prices took a nosedive Qiymətlər kəskin surətdə aşağı düşdü*

**nosedive[2]** ['nouzdaɪv] *v* **1.** *av.* sərt şığımaq; **2.** kəskin şəkildə aşağı düşmək, azalmaq; *Demand for oil has nosedived Neft məhsullarına olan tələbat kəskin şəkildə aşağı düşdü*

**noseless** ['nouzlɪs] *adj* **1.** burunsuz, burnu olmayan; **2.** lüləksiz, lüləsiz, lüləyi qırıq

**nosegay** ['nouzgeɪ] *n* **1.** ətirli çiçəklərdən ibarət buket / gül dəstəsi; **2.** ətir, rayihə, aromat

**noser** ['nouzər] *n* **1.** qarşı əsən külək, birbaşa döşə dəyən bərk külək; **2.** xəbərçi, çuğulçu, çuğul, xəfiyyə

**nosering** ['nouzrɪŋ] *n* **1.** burun halqası *(kələnin / buğanın burnuna taxılan);* **2.** buruna taxılan üzük *(bəzək)*

**nose-wise** ['nouzwaɪz] *adj d.d.* özünə qürrələnən /güvənən /inanan / arxayın olan, lovğa; özünə vurğun / vurulmuş

**nosey** ['nouzɪ] *adj* **1.** *arx.* iriburun, yekəburun, uzunburun; **2.** yaxşı duyma / iybilmə qabiliyyəti olan *(heyvanlar haq.);* **3.** *jarq.* hər şeylə maraqlanan; ~ **neighbours** hər şeylə maraqlanan qonşular; hər yerə özünü soxan, hiyləgər, biç; *Don't be so nosey! Burnunu / Burnunuzu hər yerə soxma! / soxmayın!;*

◊ **Nosey Parker** *(həm də* **Nosy Parker***)* hər şeylə maraqlanan adam; *I caught that Nosey Parker reading my diary Mən bu burnunu hər yerə soxanı (mənim) gündəliyimi oxuyarkən yaxaladım*

**nostalgia** [nɔs'tældʒɪə] *n* **1.** vətən həsrəti; **2.** keçmişə həsrət

**nostalgic** [nɔs'tældʒɪk] *adj* **1.** vətən həsrəti çəkən; vətən həsrəti yaradan; **2.** keçmişin / gəncliyin həsrətini çəkən; ötüb-keçənləri yada salan; ~ **tunes** keçmişi yada salan mahnılar/melodiyalar

**nostalgically** [nɔs'tældʒɪklɪ] *adv* həsrətlə, həsrət çəkə-çəkə

**nostril** ['nɔstrɪl] *n* burun deşiyi; **left ~** burunun sol

deşiyi; **right** ~ burnunun sağ deşiyi; *The Indian princess wore a diamond in her right nostril Hind şahzadə xanımı burnunun sağ deşiyinə brilyant taxmışdı*

**nostrum** ['nɔstrəm] *n kin.* bütün dərdlərin dərmanı; panaseya *(yalançı kimyagərlərin düzəltdiyi və guya bütün xəstəlikləri sağaldan dərman); There is no simple nostrum for political and social evils Siyasi və ictimai bəlaları sağaldа biləcək elə bir dərman yoxdur*

**nosy** ['nouzı] *adj* = **nosey**

**not** [nɔt] *part.* **1.** *Köməkçi və ya modal fellərlə birləşərək işlənir; Bu halda, xüsusən danışıqda və qeyri-rəsmi dildə qısaldılaraq,* **n't** *şəklində işlədilir; Azərbaycan türkcəsinə müxtəlif inkar şəkilçilərə müvafiq gəlir;* **-ma, -mə, -m** və s. *Do not (don't) sell Satma/Satmayın, Do not (don't) come Gəlmə/Gəlməyin; I do not (don't) know Mən bilmirəm; Do not (Don't) be afraid Qorxma! / Qorxmayın!; I cannot speak English Mən ingiliscə danışa bilmirəm; She must not go to London O, Londona getməməlidir;* **2.** *Bağlayıcı fellə işlənərkən Azərbaycan türkcəsinə* **deyil** *sözü ilə tərcümə edilir; Bu halda* **not** *qısaldılır və bağlayıcı fellə birlikdə* **n't** *şəklində işlədilir:* **isn't, wasn't** və s.; *It is not (isn't) cold today Bu gün soyuq deyil; It was not (wasn't) 5 when he returned O, qayıdanda saat 5 deyildi;* **3. to believe, to expect, to hope, to trust** *və s. fellərdən sonra qısa cavablarda işlənir. Bu halda o, Azərbaycan türkcəsinə* **yox** *sözü ilə tərcümə edilir: -Will it rain? -I believe, not -Yağış yağacaqmı? -Ümid edirəm ki, yox; -Does she know about it? -I believe, not -O, bu barədə bilirmi? -İnanıram ki, yox;* **4. Is he, Are you, Can he, Shall we,** *etc. suallarında inkar alternativi ifadə etmək üçün işlədilir və bu halda o, Azərbaycan türkcəsinə* **yox** *sözü ilə tərcümə edilir: Is he ready or not? O, hazırdır ya yox? Can you help me or not? Sən / Siz mənə kömək edə bilərsən / bilərsiniz, ya yox?;*

◊ *Not at all 1) dəyməz; Thank you for your help -Not at all Köməyinə / Köməyinizə görə sağ ol / olun -Dəyməz; 2) qətiyyən, əsla, xeyr; Do you mind if I open the window? -Not at all Mən pəncərəni açsam etiraz etməzsən ki? / etməzsiniz ki? Əsla / Xeyr; Did you like the film? -Not at all Filmdən xoşun / xoşunuz gəldimi? Əsla / Qətiyyən*

**notable**[1] ['noutəbl] *n* məşhur/görkəmli/ vacib adam; *The local notables were there Yerli görkəmli / tanınmış adamlar orada idilər*

**notable**[2] ['noutəbl] *adj* çox gözəl / yaxşı / qəşəng; görkəmli, məşhur; tanınmış; ~ **achievement** çox gözəl uğur / nailiyyət; ~ **event** böyük hadisə; ~ **painter / writer / composer,** *etc.* məşhur rəssam / yazıçı / bəstəçi və s.; ~ **speaker** çox yaxşı natiq; **a man ~ for his wit** hazırcavablığı ilə tanınmış adam; **to make a ~ contribution to scientific research** elmi tədqiqat aparmaq üçün gözə çarpacaq yardım etmək; *This town is notable for its ancient museum Bu şəhər özünün qədim muzeyi ilə məşhurdur*

**notably** ['noutəblı] *adv* **1.** gözə / nəzərə çarpacaq dərəcədə; ~ **higher sales** nəzərə çarpacaq dərəcədə yüksək satış; **to vary** ~ nəzərə / gözə çarpacaq dərəcədə fərqlənmək; ~ **higher** gözə çarpacaq dərəcədə yüksək; **2.** son dərəcə; **a ~ interesting book** son dərəcə maraqlı kitab; ~ **uncomfortable** son dərəcə narahat; **a ~ talented young painter** son dərəcə istedadlı gənc rəssam; **3.** nümayişkaranə, açıq-açığına; *Some representatives were notably absent at the meeting Nümayəndələrin bir neçəsi nümayişkaranə tərzdə iclasda iştirak etmirdilər*

**notarial** [nou'teərıəl] *adj hüq.* notarius; ~ **attestation** notariusun təsdiq etməsi; ~ **act** notarius aktı; notarius sənədi, notarius tərəfindən tərtib edilən sənəd; ~ **seal** notarius möhürü

**notarise** ['noutəraız] *v* = **notarize**

**notarize** ['noutəraız] *v hüq.* notariusda təsdiq etmək / etdirmək; *Please have your document notarized and return it to this office Zəhmət olmasa, sənədini/sənədinizi notariusda təsdiq etdirib bu ofisə qaytar / qaytarın*

**notary** ['noutərı] *n hüq.* notarius *(həm də ~* **public***)*

**notation** [nou'teıʃn] *n* **1.** notasiya *(şərti yazılı işarələr sistemi)*, şərti işarələrlə qeyd etmə /göstərmə; **decimal** ~ ərəb rəqəmləri ilə qeyd etmə/göstərmə; **2.** siyahı, cədvəl, göstərici; indeks; indeks düzəltmə; **3.** qeyd; qeydə alma, diqqət yetirmə

**not-being** ['nɔt'bi:ıŋ] *n fəls.* yoxluq, olmama, mövcud olmama

**notch**[1] [nɔtʃ] *n* **1.** nişan qoyma, nişanlama; **to cut / to make a ~ on a stick** ağacda kərtik açmaq *(hesablamaq məqsədilə); For each day he spent on the island, he cut / made a notch on a stick Adada keçirdiyi hər gün üçün o, ağac üzərində bir kərtik qoyurdu;* **2.** nişan, işarə, damğa, kərtik; yarıq; oyuq, çuxur, qazıq; aralıq; cızıq; **3.** diş *(mişarda, darağda və s.);* **4.** dar keçid / dərə *(dağda);* **5.** səviyyə; dərəcə; **to the lowest** ~ son dərəcəyə qədər; **up to the** ~ lazımi səviyyədə; *Prices are at the lowest notch Qiymətlər son həddədir;*

◊ **top** ~ ən yüksək nəticə, yüksək keyfiyyət

**notch**[2] [nɔtʃ] *v* **1.** kərtikləmək, kərtik açmaq; çapmaq, yarmaq; oyuq açmaq; doğramaq, kəsmək; **to ~ *smth.* down on a stick** ağac üzərində bir şeyi kərtik açmaqla qeyd etmək; **2.** doğramaq, mişarlamaq *(ağacı);* **3.** oxu yaya qoymaq;

◊ **to ~ *smth.* up** bir şey qazanmaq; **to ~ up heavy gains** böyük gəlir əldə etmək

**notched** [nɔtʃt] *adj* dişli; diş-diş; ~ **wheel** dişli çarx

**note**[1] [nout] *n* **1.** *(adət. pl)* **~s of a journey** yol qeydləri; **short-hand ~s** stenoqram *(stenoqrafik yazı);* **to lecture from / with ~s** qeydlərlə mühazirə demək / oxumaq; **to lecture without ~s** mühazirəni qeydsiz oxumaq / demək; *Our teacher always lectures without notes Bizim müəllimimiz mühazirəni həmişə qeydsiz oxuyur;* **to make / to take ~s** qeyd götürmək, yazmaq; **to take ~s of a lecture** mühazirəni yazmaq, mühazirədə qeyd götürmək; *He was sitting and taking notes of everything that was said O, oturub deyilənlərin hamısı haqqında qeyd götürürdü / hamısını yazırdı;* **to make ~s for an article** məqalə yazmaq üçün qeydlər etmək; **critical ~s** tənqidi qeydlər; **2.** qeyd, haşiyə *(səhifənin aşağısında, xətt altında yazılan izahat);* **to write ~s on a text** mətnə dair izahat vermək; **explanatory ~s** izahat qeydləri *(kitabın sonunda verilən);* **3.** kağız, qısa şəxsi məktub; **a ~ of thanks** təşəkkür məktubu; **a ~ of invitation** yazılı dəvətnamə; **4.** diplomatik nota; **exchange of ~s** bir-birinə nota göndərmə; **to present a ~** nota ilə müraciət etmək, nota göndərmək; **5.** *mus.* not; *Sing the first few notes of a tune Melodiyanın bir neçə notunu oxu / oxuyun;* **6.** dil *(pianoda, qarmonda və s.);* **the black ~s and the white ~s** qara dillər və ağ dillər *(pianoda və s.); First hit the black notes, then the white notes Əvvəlcə qara, sonra isə ağ dilləri bas/basın;* **7.** diqqət; **a performance/article/a novel worthy of ~** diqqətəlayiq tamaşa / məqalə / roman; *Take note of what you say Nə dediklərinə / dediklərinizə diqqət yetir / yetirin;*

◊ **to compare ~s** təəssüratlarını / məlumatlarını bir-birinə bildirmək

**note**[2] [nout] *v* **1.** görmək, müşahidə etmək; diqqət yetirmək, hiss etmək; göz qoymaq; **to ~ a misprint** çap səhvini görmək; **to ~ a resemblance** oxşarlığı görmək/ hiss etmək; *Note that the child is only ten years old Diqqət yetir/ yetirin, uşağın ancaq on yaşı var;* **2.** nəzərə almaq; təsdiq etmək; **to ~ the content of a letter** məktubun məzmununu nəzərə almaq; **3.** qeyd götürmək /etmək, yazmaq *(həm də* **to ~ down***); The author has noted his comments in the margin of the manuscript Müəllif iradlarını əlyazmasının qırağında qeyd edib; The secretary noted down the date of the meeting in his memorandum book Katibə iclasın tarixini yaddaş dəftərinə qeyd edi;* **4.** izahat/şərh yazmaq, annotasiya yazmaq; **5.** göstərmək, xatırlatmaq; *As the author notes,... Müəllifin xatırladığı/göstərdiyi kimi,...;*

◊ **to ~ a protest** protest / qəti etiraz bildirmək

**note-book** ['noutbuk] *n* dəftər; qeyd dəftəri, bloknot

**note-case** ['noutkeıs] *n* bumajnik *(pul və ya kağız qoymaq üçün cib kisəsi)*, portmanat

**noted** ['noutıd] *adj* **1.** məşhur, şöhrətli, tanınmış; ~ **actresses** məşhur / tanınmış aktrisalar; ~ **for courage** cəsarətə görə məşhur / tanınmış; ~ **for beauty** gözəlliyi ilə məşhur / tanınmış; **a ~ pianist** məşhur / tanınmış pianoçu; **a town ~ for its fine buildings** öz gözəl binaları ilə məşhur şəhər; *He was a man noted in many ways O, bir çox cəhətdən tanınmış adam idi;* **2.** *mus.* not yazılmış

**notedly** ['noutıdlı] *adv* gözə / nəzərə çarpacaq dərəcədə; xüsusi olaraq, xüsusilə, xüsusən, ələlxüsus; xüsusi bir tərzdə; olduqca, müstəsna surətdə

**noteless** ['noutlıs] *adj* **1.** naməlum, adsız-sansız, şöhrətsiz, tanınmaz; nəzərə çarpmayan; **a ~ poet** adsız-sansız şair; **2.** musiqi ahəngi olmayan, kar *(səs haq.)*

**noteworthily** ['nout.wə:ðılı] *adv* olduqca, son dərəcə, fövqəladə; çox gözəl / yaxşı / qəşəng; **to sing songs** ~ mahnıları çox gözəl / qəşəng oxumaq

**noteworthy** ['nout.wə:ðı] *adj* önəmli, diqqətəlayiq; diqqətçəkən; **a ~ performance** diqqətəlayiq tamaşa; **to write a ~ book** diqqətəlayiq kitab yazmaq

**nothing**[1] ['nʌθıŋ] *n* **1.** boş / əhəmiyyətsiz / cüzi şey; **mere** ~ sadəcə olaraq boş şey; **the little ~s of life** həyatın xırda-xuruş işləri; **2.** sıfır; *He's five feet nothing Onun boyu düz beş futdur; The score was three-nothing id. Hesab üç-sıfır idi*

**nothing**[2] ['nʌθıŋ] *pron* heç nə / şey; *There's nothing in this box Bu qutuda heç nə / şey yoxdur; I've got nothing Mənim heç nəyim yoxdur; There's nothing unusual about my leaving the office early Mənim idarədən tez çıxıb getməyimdə qeyri-adi bir şey yoxdur; He said nothing O, heç nə demədi; Nothing was heard of him Ondan bir xəbər çıxmadı;* **to come to ~** nəticəsiz / heç nəsiz qurtarmaq; **~ ... but** -dan, -dən başqa; *Nothing for supper but a little piece of cheese Şam yeməyinə bir parça / qırıq pendirdən başqa bir şey yoxdur; Don't have him for a friend; he's nothing but a criminal Onunla dostluq etmə / etməyin; o, cinayətkardan başqa bir şey deyil;* **to have /to be ~ to do with** dəxli / aidiyyəti olmamaq; *That crime is / has nothing to do with me O cinayətin mənə dəxli/aidiyyəti yoxdur;* **for ~** havayı, çox ucuz; *I got this bicycle for nothing Mən bu velosipedi çox ucuz / havayı aldım*

**nothing**[3] ['nʌθıŋ] *adv* qətiyyən, zərrə qədər də olsa; əsla, əsla yox; *It differs nothing from Bu əsla fərqlənmir; It helps us nothing O bizə əsla kömək etmir; He's nothing like so well today as he was yesterday Dünən o özünü bu günkündən xeyli yaxşı hiss edirdi;*

◊ **~ like** yaxşısı yoxdur, yaxşı heç nə; *There's nothing like doing things at once İşi dərhal görməkdən yaxşı heç nə yoxdur*

**nothingness** ['nʌθıŋnıs] *n* **1.** heçlik, yoxluq, olmama, mövcud olmama; **to pass into ~** yox

qeyb olmaq; *Is there only nothingness after death? Ölümdən sonra heçlikdən başqa bir şey yoxdurmu?;* 2. boşluq, yararsızlıq; *Her husband's death left a feeling of nothingness in her heart Ərinin ölümü onun qəlbində bir boşluq hissi yaratdı*

**notice[1]** ['noutɪs] *n* 1. bildiriş, bildiriş vərəqəsi; məlumat vermə; xəbərdarlıq, xəbərdarlıq məktubu; **formal** ~ rəsmi xəbərdarlıq məktubu / bildirişi; ~ **of receipt** almaq haqqında qəbz; **without further** ~ əlavə bildiriş / xəbərdarlıq olmadan; **to serve** ~ rəsmi olaraq xəbərdarlıq etmək / bildirmək; bildiriş vermək; **to put up a** ~ elan asmaq / vurmaq; *This is to give notice, Notice is hereby given... Bununla xəbər verilir ki,...;* **at short** ~ o saat, təxirə salmadan; **deposit at short** ~ *mal.* qısamüddətli əmanət; 2. müqaviləni pozmaq haqqında xəbərdarlıq; *The servant was given notice Xidmətçi işdən çıxarılması barədə xəbərdar edildi; The servant gave notice Xidmətçi işdən gedəcəyi haqqında xəbərdarlıq etdi;* **to get a month's** ~ işdən getmək haqqında bir ay əvvəl xəbərdarlıq almaq; **to give in one's** ~ işdən getmək haqqında ərizə vermək *(işə götürənə);* 3. diqqət, fikir; etina; **to take no** ~ **of smb.** bir kəsə diqqət yetirməmək/fikir verməmək; *I shouted but she took no notice Mən qışqırdım, lakin o, fikir vermədi;* **to be below / beneath** ~ diqqət yetirməyə layiq olmamaq; **to meet with public** ~ ictimaiyyətin diqqətini özünə cəlb etmək; **to avoid** ~ diqqətdən kənarda qalmağa çalışmaq; **to bring /to call smth. to smb.'s** ~ bir kəsin diqqətini bir şeyə cəlb etmək; **to come into** ~, **to come / to fall under smb.'s** ~ diqqəti özünə cəlb etmək; **to escape** ~ diqqətdən qaçmaq / kənarda qalmaq; *This work cannot escape the notice of historians Bu əsər tarixçilərin diqqətindən kənarda qala bilməz;* 4. elan; **to publish a marriage** ~ evlənmə haqqında elan dərc etmək; **death** ~ ölüm / matəm elanı; qısa nekroloq; 5. icmal, resenziya *(bir əsər, tamaşa və s. haqqında yazılmış tənqidi rəy);* mətbuatda dərc olunan rəy; *The play had favourable notices Qəzetlər pyes haqqında müsbət rəylər verdilər / dərc etdilər*

**notice[2]** ['noutɪs] *v* 1. görmək, fikir vermək; diqqət yetirmək; *Did you notice me leave /leaving my house Evimdən çıxıb gedəndə məni gördünmü?/gördünüzmü?; Did you notice whether I locked the door or not? Sən/ Siz fikir verdinmi / verdinizmi mən qapını bağladım ya yox?; I was not noticing Mən diqqət / fikir vermirdim;* **to get oneself** ~**d** diqqəti özünə cəlb etmək; 2. qeyd etmək, yada salmaq, xatırlamaq; **to** ~ **smb.'s usefulness** bir kəsin verdiyi faydanı qeyd etmək *(məruzədə və s.);* 3. icmal vermək, resenziya / rəy yazmaq *(kitaba və s.);* **to** ~ **a book** kitaba rəy yazmaq; 4. *hüq.* xəbərdarlıq etmək, xəbər vermək; bildirmək; *The workers were noticed on Friday Fəhlələr cümə günü xəbərdarlıq aldılar (işdən çıxarılma haq.)*

**noticeable** ['noutɪsəbl] *adj* 1. görünən, gözəçarpan / görünən; aydın, aşkar; ~ **difference** aydın /aşkar fərq; *There's been a noticeable improvement in her handwriting Onun xəttində gözə çarpa bilən yaxşılaşma var; There was a noticeable difference between two sisters İki bacı arasında aydın /aşkar fərq vardı;* 2. diqqətəlayiq; ~ **for its beauty** gözəlliyinə rəğmən / görə diqqətəlayiq

**noticeably** ['noutɪsəblɪ] *adv* gözəçarpacaq qədər, nəzərəçarpacaq dərəcədə; xeyli; əhəmiyyətli dərəcədə; *Crime has decreased noticeably Cinayət xeyli/gözəçarpacaq dərəcədə azalıb*

**notice-board** ['noutɪsbɔ:d] *n* elanlar üçün lövhə

**notifiable** ['noutɪfaɪəbl] *adj* qeyd edilməli, qeyd edilməsi vacib / gərək olan *(xüs. xəstəlik);* ~ **disease** hökmən qeydə alınmalı olan yoluxucu xəstəlik

**notification** [ˌnoutɪfɪ'keɪʃn] *n* 1. bildiriş, bildiriş vərəqəsi; xəbər / məlumat vermə; xəbərdarlıq; nota vermə, nota ilə bildirmə; **to receive** ~ **of smth.** bir şey haqqında bildiriş vərəqəsi almaq; 2. elan, elan vermə; 3. qeyd etmə, qeydə alma *(ölümü, xəstəliyi və s.)*

**notify** ['noutɪfaɪ] *v (pt, pp* **-fied***)* 1. nota vermək; bildirmək, xəbər vermək; **to** ~ **smb. of smth.** bir kəsə bir şey haqqında xəbər vermək; *Have the authorities been notified of this Müdiriyyətə bu barədə xəbər verilibmi?;* **to** ~ **the police of a loss** itki / itmiş şey haqqında polisə xəbər vermək; **to** ~ **smb. of a decision** qərar haqqında bir kəsə xəbər vermək; **to be notified of smth.** bir şey barədə bildiriş *(vərəqəsi)* almaq; *He was notified that he must depart at once Ona xəbər vermişlər ki, o, dərhal çıxıb getsin;* 2. elan etmək; hamının nəzərinə çatdırmaq; **to** ~ **of one's intention** öz niyyəti/məqsədi haqqında elan vermək; *The king notified to the country his intention of holding a parliament Kral parlamenti çağırmaq haqqında niyyətini /məqsədini ölkəyə elan etdi;* 3. məlumat vermək; 4. qeydə almaq, yazmaq; **to** ~ **a birth** doğumu qeydə almaq

**notion** ['nouʃn] *n* 1. anlayış; təsəvvür, məlumat; **to have no** ~ **(of)** anlayışı / təsəvvürü olmamaq; *I had no notion of her private life Mənim onun şəxsi həyatı haqqında (heç bir) anlayışım yox idi;* **a political system based on the** ~**s of equality and liberty** bərabərlik və azadlıq anlayışına əsaslanan siyasi sistem / quruluş; *She has no notion of the difficulty of this problem Onun bu problemin çətinliyi haqqında heç bir təsəvvürü yoxdur;* 2. baxış, nəzər, görüş, nöqteyi-nəzər, fikir; **the common** ~ ümumi baxış / nöqteyi-nəzər; *My husband got the notion of selling our house Mənim ərim evimizi satmaq fikrinə düşüb;* 3. kəşf, cihaz; **machines for flying in the air, and other wonderful** ~**s** havada uçan maşınlar və digər heyrətamiz kəşflər; 4. *(of)* niyyət, meyl; *I've no notions of going yet Mənim hələ qətiyyən getmək fikrim / niyyətim yoxdur;* 5. *arx.* ağıl, dərrakə; *His notion weakens (Shakespeare) Onun ağlı zəifləyir*



**notional** ['nouʃənl] *adj* 1. mücərrəd, abstrakt; nəzəri; 2. xəyali, göz qabağına gətirilə bilən; təsəvvür edilən/ edilə bilən; ~ **figures** xəyali rəqəmlər; *My calculation is based on notional figures, since the actual figures are not yet available Həqiqi rəqəmləri hələlik əldə etmək mümkün olmadığına görə mənim hesablamam xəyali rəqəmlərə əsaslanır;* 3. *qram.* əsas; ~ **parts of speech** əsas nitq hissələri

**notionally** ['nouʃnəlɪ] *adv* mücərrəd, mücərrəd olaraq; nəzəri olaraq

**notions** ['nouʃənz] *n* qalantereya, xırdavat *(sancaq, iynə, sap və s.)*

**notoriety** [ˌnoutə'raɪətɪ] *n* pis / şərəfsiz ad; yalançı şöhrət; **to bring smb. into** ~ bir kəsə pis ad qazandırmaq

**notorious** [nou'tɔ:rɪəs] *adj* 1. qatı, qəddar; pis əməlləri və ya keyfiyyətilə tanınan; adı çıxmış, dilə düşmüş; **a** ~ **criminal** qatı / qəddar cinayətkar; **a** ~ **thief** məşhur / ad çıxarmış oğru; **a** ~ **woman** pis ad çıxarmış qadın; 2. hamıya məlum

**notoriously** [nou'tɔ:rɪəslɪ] *adv* yaramazcasına, yaramaz bir tərzdə

**notwithstanding[1]** [ˌnɔtwɪθ'stændɪŋ] *adv* baxmayaraq ki, bununla belə; *He tried to prevent the marriage but it took place notwithstanding Baxmayaraq ki, o, izdivaca mane olmağa çalışdı, o baş tutdu*

**notwithstanding[2]** [ˌnɔtwɪθ'stændɪŋ] *prep.* baxmayaraq, ziddinə, zidd olaraq; *They travelled notwithstanding the storm Tufana baxmayaraq, onlar səyahəti davam etdirdilər; Language difficulties notwithstanding, he soon grew to love the country and its people Dil çətinliklərinə baxmayaraq, o, tezliklə ölkəni və onun adamlarını sevdi*

**nougat** ['nu:ga:] *n* nuqa, qoz *(fındıq, şəkər (və ya bal) və yumurtanın ağından hazırlanmış şirniyyat)*

**nought** [nɔ:t] *n* 1. sıfır, sıfır rəqəmi; ~ **point one** (0:1) sıfır:bir; *Write three noughts on the blackboard Yazı taxtasında üç sıfır yaz / yazın;* 2. heç şey / nə, boş yer, boşluq; **to bring to** ~ 1) yox etmək, heç-heçə qurtarmaq; 2) yer üzündən silmək; ◊ **for** ~ *arx.* 1) mənfəətsiz, xeyirsiz; 2) havayı, pulsuz

**noun** [naun] *n qram.* 1. isim; **proper** ~ xüsusi isim; **common** ~ ümumi isim; 2. ad

**nourish** ['nʌrɪʃ] *v* 1. yedirtmək, qidalandırmaq; **to** ~ **well/badly/sufficiently/artificially** yaxşı /pis /kifayət qədər/süni qidalandırmaq; **to** ~ **smb. on/with smth.** bir kəsə yeməyə bir şey vermək; **to** ~ **a child on milk** uşağa süd yedirtmək, uşağı südlə qidalandırmaq; **to be well** ~**ed** yaxşı qidalandırılmaq; **to be ill** ~**ed** pis qidalandırılmaq; **to** ~ **the soil** torpağı qidalandırmaq; **to** ~ **one's mind/soul** ağlına /qəlbinə qida vermək; 2. bəsləmək; **to** ~ **hatred** nifrət bəsləmək; **to** ~ **hope ümid** bəsləmək; 3. döşlə qidalandırmaq *(uşağı)*

**nourishing** ['nʌrɪʃɪŋ] *adj* 1. qidalı, bəsləyici; ~ **food** qidalı yemək; 2. doyumlu, tezdoyduran; **to have a** ~ **meal** doyumlu xörək yemək

**nourishment** ['nʌrɪʃmənt] *n* 1. qida, yeyəcək, yeyinti, xörək; **to supply** ~ yedirtmək, qidalandırmaq; **to take** ~ yemək, qidalanmaq; *He took no nourishment all day until dinner Nahara qədər o, yemək yemədi;* **to obtain** ~ **from the soil** torpaqdan qida almaq; 2. qida *(mənəvi);* **books that provide** ~ intellektual qida verən kitablar

**nous** [naus, nu:s] *n fəls.* ağıl, dərrakə, idrak, zehin; **a clever girl with lots of** ~ ağıllı və dərin idraka malik qız

**Nov** [nouv] *n* **November** *sözünün qısa forması;* **21 Nov 1999** 21 noyabr 1999-cu il

**nova** [nouvə] *n (pl* **novas** *və ya* **novae** [-vɪ:]) *astr.* təzə ulduz

**novae** ['nouvɪ:] **nova** *sözünün cəm forması*

**novate** ['nouveɪt] *v* yeniləşdirmək, təzələmək

**novator** [nou'veɪtə[r]] *n* novator, yenilikçi, yenilik yaradan / tətbiq edən

**novel[1]** ['nɔvl] *n* 1. roman; **to read / to write a** ~ roman oxumaq / yazmaq; **the** ~**s of Dickens** Dikensin romanları; **historical/ scientific-fiction/romantic** ~**s** tarixi/ elmi-fantastik romanlar; romantik əsərlər; 2. novella; 3. *arx.* yenilik

**novel[2]** ['nɔvl] *adj* yeni, təzə; əvvəllər olmayan; ~ **idea** yeni / təzə fikir; ~ **forms of government** yeni / təzə idarə üsulu; **a** ~ **design** yeni dizayn

**novelette** [ˌnɔvə'let] *n* 1. povest; yüngül / ucuz sevgi romanı *(həm də* **penny** ~*);* 2. *mus.* novelletta

**novelist** [ˌnɔvə'lɪst] *n* 1. romançı *(roman yazan yazıçı);* 2. *arx.* novator, yenilikçi; 3. *arx.* xəbər gəzdirən, qeybətçi

**novella** [nou'velə] *n (pl* **novellas***)* novella, qısa roman

**novelty** ['nɔvəltɪ] *n* 1. yenilik; **the charm of** ~ yeniliyin gözəlliyi; *There's a certain novelty in this approach Bu yanaşmada müəyyən bir yenilik var; Hard work was no novelty to a person from a poor family like him Onun kimi kasıb bir ailədən olan adam üçün ağır iş yenilik deyildi;* 2. xırdavat, ucuz və çox da faydalı olmayan şeylər; **Shops full of Christmas novelties in December** Dekabr ayında yeni il xırdavatılə dolu mağazalar; **a** ~ **toy** xırda oyuncaq

**November[1]** [nou'vembə[r]] *n* noyabr; **in** ~ noyabrda, noyabr ayında

**November**[2] [nou'vembəʳ] *adj* noyabr; ~ **days** noyabr günləri

**novice**[1] ['nɔvɪs] *n* **1.** təzə işçi/şagird; xam, təcrübəsiz, naşı *(adam)*; **to be a ~ in / at smth.** bir şeydə xam / naşı / təcrübəsiz olmaq; *She's a complete novice as a reporter O, icmalçı kimi tamam naşıdır / təcrübəsizdir;* **2.** dini icmaya yenicə qoşulmuş adam; **3.** cıdırda hələ baş priz almamış at

**novice**[2] ['nɔvɪs] *adj* təcrübəsiz, naşı, xam; **a ~ writer/salesman/cook** təcrübəsiz yazıçı / satıcı / aşpaz

**novocaine** ['nouvəkeɪn] *n əcz.* novokain *(keyləşdirici dərman)*

**now**[1] [nau] *n* hazırkı vaxt, hazırkı an; *Now's the time for action İndi hərəkət etmək vaxtıdır;* **up to ~** indiyə qədər

**now**[2] [nau] *adj* hazırkı, indiki; **the ~ king** hazırkı / hazırda hakimiyyətdə olan kral

**now**[3] [nau] *adv* **1.** hazırda, hal-hazırda, indi; **~ or never, ~ if ever** indi, yaxud heç vaxt; *Where are you living now? Hazırda sən/siz harada yaşayırsan?/yaşayırsınız?; It's now ten years since we got married İndi biz on ildir ki, evlənmişik; I'm now ready to answer your questions İndi mən sənin / sizin suallarına / suallarınıza cavab verməyə hazıram; I'm busy just now Mən hal-hazırda məşğulam;* **2.** indicə, bu saat; *He was here just now O, indicə burada idi; Do it now! Təxirə salma! / salmayın!*

◊ **(every) ~ and again/then** hərdən- bir, gecgec, təsadüfdən-təsadüfə; *I go to the opera now and then Mən operaya təsadüfdən-təsadüfə gedirəm; Every now and again she checked to see if the child was still asleep O, hərdənbir uşağın hələ də yatıb-yatmadığını yoxlayırdı;* **now ..., now** gah ..., gah; *Her moods kept changing - now happy, now sad Onun ovqatı dəyişməkdə davam edirdi; gah şən, gah qəmgin olurdu*

**now**[4] [nau] *conj (Çox vaxt* **that**-*la işlənir)* bir halda ki, indi ki, madam ki; *Now that you are well again, you can travel Madam ki, sağalmısan / sağalmısınız, səyahət edə bilərsən / bilərsiniz; Now you have past your test you can do anything you like Bir halda ki, imtahanını / imtahanınızı vermisən / vermisiniz, istədiyini / istədiyinizi edə bilərsən / bilərsiniz*

**nowadays** ['nauədeɪz] *adv* hazırda, bizim zamanda/günlərdə, indi; *Nowadays, many children prefer watching TV to reading Bizim zamanda/Hazırda əksər uşaqlar TV-yə baxmağı oxumaqdan üstün tuturlar; I thing nowadays nobody reads soviet novels Məncə, indi heç kim sovet romanlarını oxumur*

**nowhere** ['nouweəʳ] *adv* **1.** heç yerdə / yanda; **~ near** yaxında heç yerdə; *He was to be found nowhere Onu heç yerdə tapa bilmədilər; The children were nowhere to be seen Uşaqlar heç yerdə görünmürdü;* **2.** heç yerə/ yana; *Where did you go after dinner? -Nowhere Nahardan sonra sən / siz hara getdin? / getdiniz?-Heç yerə;*

◊ *This will take you nowhere? Bu sizə heç nə verməyəcək; This takes us nowhere Bu bizə heç nə vermir (boş söhbət və s. haq.)*

**noxious** ['nɔkʃəs] *adj* zərərli, ziyanlı; zəhərli; sağlam olmayan, səhhət üçün yaramayan; **~ climate** səhhət üçün yaramayan iqlim; **~ plants** zəhərli bitkilər; **~ to vegetables and animals** tərəvəzlər və heyvanlar üçün zərərli / ziyanlı; fauna və flora üçün ziyanlı / zərərli

**nozzle** ['nɔzl] *n* **1.** lülə *(çaydanda və s.)*; boğaz *(şüşədə və s.)*; **2.** *tex.* ucluq; forsunka *(buxar qazanlarının odluğuna, mühərriklərin silindrinə və s.-yə maye və ya toz halında yanacaq vermək üçün cihaz)*; qol, boru

**n't** [nt] **not** *ədatının qısa forması;* **had not = hadn't, do not = don't, did not = didn't, is not = isn't,** *etc.*

**nuance** [nju:'a:ns] *n fr.* nüans, incə fərq, fərq inceliyi, çalar; **~s of taste which are hard to describe** təsviri çətin olan zövq çaları

**nub** [nʌb] *n* **1.** topa, yığın; qaya, quyma *(iri daş/buz və s. parçası)*; **a ~ of coal** kömür topası/yığını; **a ~ of ice** iri buz parçası; **2.** qırıq, parça; **a ~ of sugar** bir parça / bir qırıq qənd; **3.** *d.d.* mahiyyət; **the ~ of the problem** problemin mahiyyəti

**nubile** ['nju:bɪl] *adj* **1.** yetişmiş, ərlik yaşına çatmış *(qız haq.)*; **2.** şəhvani cəhətdən cazibədar; **a photograph of a ~ young woman** şəhvani cəhətdən cazibədar gənc qadın şəkli / fotosu

**nubility** [nju:'bɪlɪtɪ] *n* yetkinlik yaşı, ərə getməli dövr, yaşa dolmuş, ərlik çağı/yaşı

**nuclear** ['nju:klɪəʳ] *adj* nüvə; **~ energy** nüvə enerjisi; **~ reactor** nüvə reaktoru; **a ~ power-station** nüvə elektrik stansiyası; **~ weapon** nüvə silahı; **~ tests** nüvə silahının sınağı; **~ age / powers** nüvə əsri / dövlətləri; **a ~ bomb** nüvə bombası; **a ~ explosion** nüvə partlayışı; **a ~ war** nüvə müharibəsi; **~ disarmament** nüvə silahlarının qadağan edilməsi; **~ particles** nüvə hissəcikləri; **~ physics** nüvə fizikası

**nuclear-free** ['nju:klɪəfri:] *adj* nüvəsiz; nüvə silahı olmayan; **campaign for a ~ world** nüvə silahı olmayan dünya uğrunda kompaniya

**nucleus** ['nju:klɪəs] *n (pl* **nuclei** [-lɪaɪ]*)* **1.** *biol.* nüvə *(hüceyrədə)*; **2.** özək, mərkəz, mahiyyət; **~ of an organization** təşkilatın özəyi; **the ~ of a community** yaşayış məntəqələrinin birləşdiyi mərkəz; **~ of a story** hekayənin mahiyyəti; *These paintings will form the nucleus of a new collection Bu şəkillər yeni kolleksiyanın əsasını təşkil edəcək;* **3.** *fiz.* nüvə *(atomun)*; **4.** *astr.* kometanın nüvəsi; **5.** çəyirdək *(meyvədə)*; ləpə *(qozda, fındıqda)*

**nude**[1] ['nju:d] *n* **1.** çılpaq / lüt qadın fiquru *(xüs. rəssamlıqda və heykəltəraşlıqda)*; **2. the ~** çılpaq bədən; **in the ~** çılpaq halda / vəziyyətdə; **to bathe in the ~** çılpaq / lüt çimmək



**nude**[2] ['nju:d] *adj* çılpaq, üryan, lüt; **a ~ beach** çılpaq / lüt çimilən çimərlik; **~ swimmers** çılpaq / üryan çimənlər; **to be caught ~** çılpaq halda tutulmaq/yaxalanmaq; **to paint ~ figures** çılpaq bədən şəkli çəkmək; **a ~ woman** çılpaq / üryan qadın; **a ~ fact** çılpaq fakt / dəlil

**nudge**[1] [nʌdʒ] *n* dirsəklə vurulan yüngül dürtmə *(xüs. diqqəti cəlb etmək üçün)*; dümsük; **to give a ~** dirsəklə dürtmə vurmaq, dürtmələmək; dümsükləmək; **to give his friend a ~ who had fallen asleep** yatmış dostunu dürtmələmək / dümsükləmək

**nudge**[2] [nʌdʒ] *v* **1.** dirsəklə ahəstə/yüngülcə dürtmə vurmaq/dümsükləmək; *I nudged her on the arm and pointed to the man sitting in front of us Mən onu dümsüklədim və bizdən qabaqda oturan kişiyə işarə etdim;* **2.** *məc.* hərəkətə gətirmək, təkan vermək *(eyhamla)*

**nudie** ['nju:dɪ] *n jarq.* **1.** çılpaq/lüt oynayan rəqqasə; **2.** şılpaq/lüt rəqqasələrin göstərdiyi tamaşa

**nudism** ['nju:dɪzm] *n* **1.** nudizm *(çılpaq bədənə itaət / sitayiş)*; **to practice ~** həmişə çılpaq / lüt / üryan gəzmək; **2.** çılpaqlıq həyatı keçirmək

**nudist**[1] ['nju:dɪst] *n* **1.** nudizm tərəfdarı; **2.** çılpaq, üryan; **a private beach for the ~s** çılpaqlar üçün xüsusi çimərlik

**nudist**[2] ['nju:dɪst] *adj* çılpaq, lüt, üryan; **a ~ camp** çılpaqların düşərgəsi; **a ~ beach** çılpaqlar çimərliyi; **a ~ magazine** çılpaq şəkillər çap edən jurnal

**nudity** ['nju:dɪtɪ] *n* **1.** çılpaq / lüt olma, çılpaqlıq, üryanlıq; **2.** çılpaq bədən *(xüs. qadın bədəni: rəssamlıqda və heykəltəraşlıqda)*

**nugget** ['nʌgɪt] *n* **1.** külçə, təbii halda tapılan mədən; **a gold ~** qızıl külçə; **2.** kəsək, parça, tikə

**nuisance** ['nju:sns] *n* **1.** zəhlətökən adam; *He's a perfect nuisance O, lap zəhlətökən adamdır;* **to make a ~ of oneself, to make oneself a ~ (to)** təngə / cana gətirmək, bezdirmək, zəhlə tökmək, bezar etmək, usandırmaq *(bir kəsi)*; *Go away, Jack, you are a nuisance Rədd ol, Cək, mənim lap zəhləmi tökmüsən!;* **2.** mancə, narahatlıq; zəhlətökən /təngəgətirən şey; *Flies and mosquitoes are a nuisance Milçəklər və ağcaqanadlar lap zəhlətökəndir; Long skirts are a nuisance Uzun yubka çox narahatlıqdır;* **3.** pərtlik, dilxorçuluq; peşmançılıq; pislik; xoşagəlməz hadisə; *What a nuisance! İşə bax! Ay Allah!;* **4.** *hüq.* ictimai qaydanı / asayişi pozma; *Commit no nuisance Zibil tökməyin, Qaydaya riayət edin!;* **to constitute a ~** ictimai qaydanı / vətəndaşların rahatlığını pozmaq *(səs, tüstü və s. haq.)*; **to remove a ~** rahatlığı pozan hər hansı bir şeyi aradan götürmək *(radionun, televizorun səsini və s.)*

**null**[1] [nʌl] *n riyaz.* sıfır

**null**[2] [nʌl] *adj* **1.** *hüq.* etibarsız, qanuni qüvvəsi olmayan; *The marriage was null Kəbinkəsmə mərasimi qanuni deyildi;* **to render ~** ləğv etmək; heçə endirmək; **~ and void** qanuni gücü olmayan, qanuni gücünü itirmiş; **ballot-papers ~ and void** etibarsız bülletenlər *(səsvermədə)*; **2.** mənası olmayan, mənasız; nəticəsiz, nəticəsi olmayan; **3.** sıfır, mövcud olmayan

**null**[3] [nʌl] *v hüq.* ləğv etmək, qeyri-qanuni etmək; *The election was nulled Seçki qeyri-qanuni hesab edildi*

**nullification** [.nʌlɪfɪ'keɪʃn] *n* **1.** ləğv etmə, etibarsız hesab etmə *(kağız pulu)*; **2.** heçə endirmə, heç etmə

**nullify** ['nʌlɪfaɪ] *v (pt, pp* **-fied)** ləğv etmək; rədd / məhv/yox etmək, aradan qaldırmaq; sıfıra / heçə endirmək; **to ~ a claim** iddianı rədd etmək; *The court nullified the claim Məhkəmə iddianı rədd etdi; An unhealthy diet will nullify the effect of training Zərərli pəhriz məşqin təsirini heçə endirər; The bad weather nullified whatever advantages we'd had Pis hava bizim əldə etdiyimiz bütün üstünlükləri heçə endirdi*

**nullity** ['nʌlɪtɪ] *n* **1.** heçlik, cüzilik; ləğv etmə; **a decree of ~** ləğv etmə haqqında qərar *(xüs. kəbini)*; heç bir şey / nə; **to shrink to a ~** heçə enmək, sıfıra bərabər etmək; **2.** heç bir rolu /əhəmiyyəti olmayan adam; *All the characters in this book seem nullities Bu kitabdakı surətlərin hamısı əhəmiyyətsizdir*

**numb**[1] [nʌm] *adj* **1.** keyləşmiş, keyimiş; donmuş; **fingers ~ with cold** soyuqdan keyləşmiş /donmuş barmaqlar; *My fingers were / went numb with cold Barmaqlarım soyuqdan keyləşdi / dondu;* **2.** dili / nitqi tutulmuş, lal olmuş, donub / quruyub/mat qalmış *(təəccübdən, qorxudan və s.)*; **to grow ~** donmaq, donub qalmaq, qurumaq, quruyub qalmaq, mat qalmaq; *The sight of the lion made me numb with fear Şiri görərkən mən qorxudan quruyub/ donub (yerimdə) qaldım*

**numb**[2] [nʌm] *v* **1.** keyləşdirmək, dondurmaq, hissiz etmək; *Cold numbed my fingers and feet Soyuq barmaqlarımı və ayaqlarımı keyləşdirdi / dondurdu;* **2.** azaltmaq, yüngülləşdirmək; *This medicine will numb the pain Bu dərman ağrını yüngülləşdirəcək / azaldacaq*

**numbed** [nʌmd] *adj* keyləşmiş, donmuş; **~ fingers/feet** keyləşmiş barmaqlar/ayaqlar

**number**[1] ['nʌmbəʳ] *n* **1.** rəqəm, say, miqdar; **in ~** miqdarca, sayca; *There were twenty in number Onlar sayca iyirmi nəfər idilər; We were few in number Biz sayca az idik;* **a large / a great ~** çox, çoxlu; **a large ~ of people** çox/çoxlu adam; *A limited number of cars is available Satışa az miqdarda maşın daxil olub;* **out of /without / beyond ~** saysız, saysız-hesabsız; külli miqdar; **any ~ 1)** istənilən qədər, çox,

çoxlu; *I've shown him any number of kindness Mən ona çox yaxşılıq etmişəm;* 2) bir çox, bir sıra; *A number of accidents always occur on slippery roadways Bədbəxt hadisələrin bir çoxu həmişə sürüşkən yollarda baş verir; A number of books is missing from the library Kitabxanadan bir sıra kitab yoxa çıxıb;* **a ~ of people 1)** bəzi / bir çox adamlar; **2)** *pl* çox, çox miqdar; *Numbers of people came to see the exhibition Sərgiyə baxmağa çox adam gəldi;* **in ~s 1)** böyük / çox miqdarda / sayda; 2) miqdarca / sayca çox; **to win by force of ~s** sayca üstün olmağa görə qələbə qazanmaq; **2.** *(sıra)* nömrə; **the ~ of a house/a taxi/a room/a page** evin/taksinin /otağın /səhifənin nömrəsi; *Take the driver's number Taksinin nömrəsini yazın;* **index** ~ sıra nömrəsi; **registration** ~ qeydiyyat nömrəsi; *He lives at N18 O, 18 nömrəli evdə yaşayır; She lives in N4 O, 4-cü nömrədə yaşayır (mehmanxanada);* **3.** *(nəşr)* nömrə; **the current ~ of a magazine** jurnalın son nömrəsində; **back** ~ 1) köhnə nömrə *(qəzet və s. haq.);* 2) köhnə, köhnəlmiş; 3) geridə / dala qalmış adam; **to feel oneself a back** ~ həyatdan dala/geri qaldığını hiss etmək; **4.** proqramın / çıxışın nömrəsi; **5.** *riyaz.* məbləğ, rəqəm, ədəd; **binary** ~ ikirəqəmli ədəd; **broken** ~ kəsr; **intact / whole** ~ tam ədəd; **Roman ~s** rum rəqəmləri *(I, II, III, IV, V və s.);* **in round ~s 1)** yuvarlaq rəqəmlə; 2) təxminən, təqribən; **6.** *qram.* tək, cəm; kəmiyyət; **the category of** ~ kəmiyyət kateqoriyası;

◊ **~ one, N-1** əsas, başlıca; **enemy N1** əsas / 1 nömrəli düşmən; *These poems are N1 Bu şerlər əladır;* **N10** (Downing Street) İngiltərənin baş nazirinin iqamətgahı

**number[2]** ['nʌmbəʳ] *v* **1.** nömrələmək, nömrə qoymaq; **to ~ houses /pages /rows** evləri / səhifələri / cərgələri nömrələmək; **2.** olmaq, var olmaq; *We numbered ten in all Biz cəmi on nəfər idik; The population numbers 6 000 000 Əhali 6 000 000-dur; Those present numbered fifty İştirakçıların sayı əlli nəfər idi;* **3. (among, in, with)** daxil/ hesab/aid etmək; qatmaq; *I number Tom among my friends Mən Tomu dostlarımın cərgəsinə qatıram; Julius Caesar is numbered among the greatest captains of all ages Yuli Sezar bütün əsrlərin ən böyük sərkərdələri sırasına daxil edilib;* **4.** saymaq, hesablamaq; *His days are numbered Onun günləri sayılıb (yəni ömrünün sonu yaxınlaşıb)*

**numbering** ['nʌmbərɪŋ] *n* nömrələmə, numerasiya

**numberless** ['nʌmbəlɪs] *adj* **1.** hədsiz, qədərsiz, saysız-hesabsız, son dərəcə çox; ~ **possibilities** saysız-hesabsız / son dərəcə çox imkanlar; *We have a numberless possibilities to carry out this project Bu layihəni həyata keçirmək üçün bizim çox imkanlarımız var;* **2.** nömrəsiz, nömrəsi olmayan

**numbing** ['nʌmbɪŋ] *adj* yeknəsəq, keyləşdirici, kütləşdirici; **the ~ monotony of the factory routine** fabrikin yeknəsəq gündəlik iş rejimi

**numbly** ['nʌmlɪ] *adv* keyləşmiş tərzdə / halda; *"I can't believe he's dead", she said numbly "Mən onun ölümünə inana bilmirəm", keyləşmiş halda o, dedi; His arms hung down numbly Onun qolları keyləşmiş halda sallanmışdı*

**numerable** ['nju:mərəbl] *adj* sayıla / hesablana bilən, sayılması mümkün olan

**numeral[1]** ['nju:mərəl] *n* **1.** rəqəm; **Arabic / Roman ~s** ərəb / Roma rəqəmləri; **2.** *qram.* say; **cardinal ~s** miqdar sayları; **ordinal ~s** sıra sayları; **simple ~s** sadə saylar; **derivative ~s** düzəltmə saylar; **compound ~s** mürəkkəb saylar

**numeral[2]** ['nju:mərəl] *adj* say, miqdar; rəqəmlə göstərilmiş / ifadə edilmiş; ~ **system** say sistemi

**numeration** [ˌnju:mə'reɪʃn] *n* **1.** sayma, hesablama, hesab; **decimal** ~ *riyaz.* onluq kəsr sistemilə hesablama; **2.** nömrələmə, nömrə qoyma

**numerator** ['nju:məreɪtəʳ] *n* **1.** *riyaz.* surət *(kəsrdə bölünən ədəd);* **2.** *tex.* numerator, hesablayıcı, sayğac

**numerical** [nju:'merɪkəl] *adj* say, miqdar; rəqəm; rəqəmlə göstərilmiş / ifadə olunmuş; ~ **data** rəqəmlə ifadə edilmiş məlumatlar; ~ **symbols** rəqəmlər; **in ~ order** nömrələrin sırasilə; ~ **ability** hesablama / sayma bacarığı / qabiliyyəti; ~ **superiority** *hərb.* miqdarca üstünlük; **the ~ force of an army** ordunun sayca gücü

**numerically** [nju:'merɪkəlɪ] *adv* sayca, miqdarca; ~ **greater** sayca/miqdarca çox; **to be ~ superior** sayca üstün olmaq; *The enemy were numerically superior Düşmən sayca üstün idi*

**numerous** ['nju:mərəs] *adj* **1.** çoxsaylı; çoxmiqdarlı; ~ **books / letters / mistakes** çoxsaylı kitab / məktub / səhv; ~ **gifts** çoxmiqdarlı hədiyyə; **2.** böyük; ~ **family / army / class** böyük ailə / ordu / sinif; **3.** zəngin; ~ **library** zəngin kitabxana; ~ **dinner** *arx.* böyük ziyafət

**numerously** [nju:'mərəslı] *adv* çoxlu /külli miqdarda

**numerousness** ['nju:mərəsnɪs] *n* çoxluq, sayca / miqdarca çoxluq

**nun** [nʌn] *n* rahibə; *She became a Catholic nun O, katolik rahibə oldu*

**nuncio** ['nʌnʃɪou] *n* (*pl* **-os** [-ouz])**1.** nunsi *(Roma papasının nümayəndəsi);* **2.** *arx.* nümayəndə; diplomatik nümayəndə *(səfirdən bir rütbə aşağı diplomatik vəzifə sahibi)*

**nuptial** ['nʌpʃl] *adj* kəbin, toy; **the ~ ceremony** toy mərasimi; ~ **feast** toy ziyafəti; ~ **day** toy günü; ~ **contact** *hüq.* kəbin müqaviləsi; ~ **bliss** kəbin xoşbəxtliyi

**nuptials** ['nʌpʃlz] *n* toy; **to celebrate** ~ toyu qeyd etmək; **to solemnize** ~ kəbin kəsdirmək

**nurse[1]** [nə:s] *n* **1.** dayə; lələ; **2.** süd anası; **3.** xəstə baxıcısı *(qadın);* tibb bacısı; **male** ~ sanitar *(xəstəxanada kiçik tibb işçisi);* **a qualified** ~ ixtisaslı sanitar/tibb bacısı; **a private** ~ şəxsi sanitar/tibb bacısı;

◊ **at** ~ dayənin himayəsində; **to put (out) to** ~ dayənin himayəsinə vermək

**nurse[2]** [nə:s] *v* **1.** döş vermək, əmizdirmək; uşağı yedirmək; **to ~ a baby** uşağa döş vermək / uşağı əmizdirmək; *She did not nurse her baby O, uşağına döş vermədi / uşağını əmizdirmədi;* **to ~ dry** döşdən / süddən kəsmək *(uşağı);* **2.** döş əmmək *(uşaq haq.);* **3.** yavaş-yavaş içmək, sormaq; **4.** xəstəyə baxmaq; **to ~ back to health** xəstəni sağaltmaq; **5.** tibb bacısı olmaq; xəstə baxıcısı olmaq; **6.** qayğı ilə / ehmalla / üsullu / diqqətlə rəftar etmək; **to ~ a horse** ata qayğılə qulluq etmək; **to ~ a car** maşını ehmalla sürmək; **7.** müalicə olunmaq; *He is nursing a cold O, soyuqdəymədən müalicə olunur;* **to ~ away a cold** zökəmdən/tumovdan sağalmaq; **8.** becərmək, pərvəriş vermək *(bitkilərə və s.);* **to ~ to a certain size** müəyyən ölçüyə qədər böyütmək; **9.** oxşamaq, əzizləmək; bəsləmək; **to ~ a hope** ümid bəsləmək; **to ~ wrath** nifrət bəsləmək; **to ~ a quarrel** mübahisəni qızışdırmaq; **10.** həvəsləndirmək, rəğbətləndirmək, şirnikləndirmək; təşviq etmək; **to ~ the arts** incəsənətin inkişafını təşviq etmək; **11.** qucağında/ dizi üstündə saxlamaq, sinəsinə sıxmaq; **to ~ one's knees** dizlərini qucaqlayaraq oturmaq;

◊ **to ~ the fire** ocağın üstünə əyilərək oturmaq; **to have a lot of unsaleable stock to ~** əlində bir yığın satılmayan mal olmaq

**nursery** ['nə:sərɪ] *n (həm də* **day nursery***)* **1.** uşaq otağı; uşaq yataq otağı; **2.** körpələr evi, uşaq bağçası; *Charlie goes to a day nursery Çarli uşaq bağçasına gedir;* **3.** şitillik

**nurseryman** ['nə:sərɪmən] *n* (*pl* **-men** [-men]) şitilliyə baxan adam *(xüs. kişi)*

**nursery rhyme** ['nə:sərɪraɪm] *n* layla, beşik mahnısı; uşaq nağılı/şeri

**nursery-school** ['nə:sərɪsku:l] *n* uşaq bağçası *(2-5 yaşında olan uşaqlar üçün)*

**nursing home** ['nə:sɪŋhoum] *n* **1.** qocalar üçün ev, qocalar evi; **2.** özəl kiçik xəstəxana

**nursing[1]** ['nə:sɪŋ] *n* **1.** qulluq, qulluq etmə, baxma; pərvəriş; orta tibb işçilərinin peşəsi; **to go in for** ~ tibb bacısı olmaq; **2.** döşlə yedirtmə; **frequent** ~ tez-tez yedirtmə *(südəmər uşağı)*

**nursing[2]** ['nə:sɪŋ] *adj* **1.** əmzikli, əmizdirən; ~ **mother** əmzikli / əmizdirən ana; ~ **time** əmizdirmə / döşvermə vaxtı; **2.** qulluq edən *(xəstəyə və s.);* **3.** südəmər; ~ **baby** südəmər körpə / uşaq; ~ **babies and bottle babies** döşlə yedirilən və butulka ilə *(yəni süni yolla)* yedirilən körpələr / uşaqlar

**nurture[1]** ['nə:tʃəʳ] *n* **1.** qayğı; tərbiyə; inkişaf; təhsil; ~ **of the mind** əqli qabiliyyətin inkişafı; **2.** *k.t.* becərmə; hasil etmə, yetişdirmə *(yeni növ / cins);* **3.** yedirtmə, yemləmə; **4.** yem, azuqə

**nurture[2]** [nə:tʃəʳ] *v* **1.** tərbiyə etmək, öyrətmək, oxutmaq, təhsil vermək, inkişaf etdirmək; **to ~ a talent** istedadı inkişaf etdirmək; **2.** *k.t.* yetişdirmək, becərmək *(yeni növ / cins);* **3.** *məc.* oxşamaq, əzizləmək, nazlamaq; bəsləmək; **to ~ a hope** ümid bəsləmək

**nut[1]** [nʌt] *n* **1.** qoz, fındıq; **shelled ~s** qabığı çıxarılmış / ləpələnmiş qoz/fındıq; **2.** *məc.* çətin / müşkül iş; **a hard ~ to crack** müşkül məsələ; çətin/islah olunmaz iş; **3.** *jarq.* baş; **to be off *one's* ~** ağlını itirmək, dəli olmaq, başına hava gəlmək; *You must be off your nut! Yəqin sən / siz dəli olmusan! / olmusunuz!;* **to work *one's* ~** baş işlətmək, fikirləşmək, düşünmək; **4.** *tex.* qayka; mufta *(halqa, bilərzik);* **to tighten the ~** qaykanı bərkitmək; **5.** kömür xəkəsi, xırda kömür;

◊ **for ~s** əsla, qətiyyən; *She sings well, but she can't dance for nuts O, yaxşı oxuyur, lakin qətiyyən oynaya bilmir; Time to leave our nuts aside Gənclik əyləncələrindən əl çəkmək vaxtıdır; He who would eat the nut must first crack the shell at. söz.* ≅ *Könlü balıq istəyənin quyruğu suda gərək; Könlü balıq istəyən gərək ayağını suya salsın;* **to do *one's* ~** hirslənmək, acıqlanmaq, qeyzlənmək; *She will do her nut when she sees the broken window O, pəncərənin qırıldığını gördükdə hirslənəcək/cin atına minəcək*

**nut[2]** [nʌt] *v* **1.** fındıq / qoz yığmaq; **to go ~ ting** fındıq /qoz yığmağa getmək; **2.** *jarq.* fikirləşmək, düşünmək, baş işlətmək

**nut-brown** ['nʌtbraun] *adj* şabalıdı, şabalıdı rəngdə; ~ **hair** şabalıdı / şabalıd rəngli saç

**nut-case** ['nʌtkeɪs] *n jarq.* gic/axmaq/başıboş / dəli adam

**nut-cracker** ['nʌtˌkrækəʳ] *n (adətən cəmdə, lakin tək mənada işlənir)* fındıqsındıran, qozsındıran; *Have you got a nutcracker/a pair of nutcrackers in the house? Evində/Evinizdə fındıqsındıran varmı?*

**nuthouse** ['nʌthaus] *n jarq.* dəlixana

**nutmeat** ['nʌtmi:t] *n* ləpə *(qoz, fındıq və s.)*

**nutmeg** ['nʌtmeg] *n* cövüz

**nut-oil** ['nʌtɔɪl] *n* qoz / fındıq / badam yağı

**nutria[1]** [nju:trɪə] *n* **1.** *zool.* qunduz; **2.** qunduz xəzi

**nutria[2]** [nju:trɪə] *adj* qunduz, qunduz xəzindən tikilmiş; ~ **coat** qunduz xəzindən tikilmiş palto

**nutrient[1]** ['nju:trɪənt] *n* qidalı maddələr; *Plants draw minerals and other nutrients from the soil Bitkilər mineralları və digər qida maddələrini torpaqdan alır*

**nutrient[2]** ['nju:trɪənt] *adj* qidalı, bəsləyici; ~ **value** qidalılıq

**nutrify** ['nju:trɪfaɪ] *v* qidalandırmaq, yedirtmək, yemləmək

**nutriment** ['nju:trɪmənt] *n* qida, yeyəcək, yeyinti, xörək; qidalı yemək; **to provide** ~ yedirt-

mək, qidalandırmaq; qida vermək *(təxəyyülə və s.)*, yeyəcəklə təmin etmək

**nutrition** [nju:'trɪʃn] *n* yedirtmə, qidalandırma; qidalanma, yemə; **science of ~** diyetika *(düzgün və səmərəli qidalanma haqqında elm)*

**nutritional** [nju:'trɪʃənl] *adj* 1. qidalı, bəsləyici; **~ value** qidalılıq dəyəri; 2. pəhriz; **~ therapy** dietoterapiya *(pəhrizlə müalicə)*

**nutritionist** [nju:'trɪʃənɪst] *n* diyetoloq *(pəhriz həkimi)*

**nutritious** [nju:'trɪʃəs] *adj* qidalı, bəsləyici

**nutritive** ['nju:trɪtɪv] *n* qida, qida maddələri; yemək, yeyəcək, yeyinti, yem

**nutritive** ['nju:trɪtɪv] *adj* qidalılıq, qidalı; **~ value** qidalılıq dəyəri

**nuts**[1] [nʌts] *n* qozkimilər *(qoz, fındıq, badam, şabalıd və s.)*

**nuts**[2] [nʌts] *adj amer. jarq.* dəli, gic, axmaq, sarsaq; *Stop that, it's driving me nuts Qurtar / Qurtarın bunu, bu məni dəli edir; She thought I would go nuts O, elə fikirləşirdi, mən dəli olacam;* **to be ~** dəli-divanə olmaq; *She was nuts about the boy next door Qız qonşu oğlandan ötrü dəli-divanə idi*

**nutshell** ['nʌtʃel] *n* qoz / fındıq qabığı;
◊ **in a ~** qısa, qısaca, yığcam; **to put it in a ~** qısaca / bir neçə sözlə demək; *To put in a nutshell, we're bankrupt Qısaca desək, biz müflisləşmişik*

**nutter** ['nʌtə^r] *n* qoz/fındıq yığan

**nutting** ['nʌtɪŋ] *n* qoz/fındıq yığmağa getmə

**nut-tree** ['nʌttri:] *n* 1. qoz / fındıq ağacı; 2. fındıqlıq, qozluq

**nutty**[1] ['nʌtɪ] *n* 1. qoz / fındıq dadı; 2. qoz / fındıq bol olan yer

**nutty**[2] ['nʌtɪ] *adj* (**-ier, -iest**) **I 1.** fındıqlı, qozlu; fındıqla/qozla bişirilmiş; **a ~ cake** fındıqlı /qozlu keks; 2. çox şıq/gözəl, yaraşıqlı, bahalı; dadlı, xoşagələn, ləzzətli

**nutty** ['nʌtɪ] *adj* (**-ier, -iest**) **II 1.** *d.d.* dəli, ağılsız; 2. dəli-divanə olan *(yəni bir kəsi/şeyi çox sevən)*

**nuzzle** ['nʌzl] *v* 1. iyləmək, imsiləmək; *The cow licked and nuzzled its calf İnək öz buzovunu yaladı və imsilədi;* 2. burnu ilə eşmək *(xüs. donuz haq.);* burnu ilə eşələnmək; **to ~ into the mud** burnu ilə palçığı eşələmək; **3. (at, about, against, in, into)** dürtmək, soxmaq; dürtülmək, soxulmaq; özünü vurmaq / çırpmaq; toxunmaq, sürtünmək; *She nuzzled her head against the boy's shoulder O, başı ilə oğlanın çiyninə toxundu; The dog nuzzled at my calves İt mənim baldırlarıma sürtündü;* **to ~ against smb.'s shoulder** burnu ilə bir kəsin çiyninə toxunmaq / sürtünmək *(at, it və s. haq.);* 4. sıxılmaq, qısılmaq; qısılıb / büzülüb yatmaq; **to ~ close to smb.** bir kəsin yanına qısılmaq; 5. rahat yerləşmək; yatağa /yorğan-döşəyə girmək; **to ~ together** yan-yana/böyür-böyürə yatmaq; **to ~ up** qazımaq, eşmək *(burnu ilə)*

**nylon**[1] ['naɪlən] *n* neylon; *This material is 45% nylon Bu material 45% neylondur;* **thread made of ~** neylon sap

**nylon**[2] ['naɪlən] *adj* neylon; **~ stocking** neylon corab; **~ tent** neylon çadır / tent

**nylons** ['naɪlənz] *n* qadınlar üçün neylondan hazırlanmış corab; **a pair of ~** bir cüt neylon qadın corabı

**nymph** [nɪmf] *n* 1. *əs.* pəri; **river ~** çay pərisi; **tree ~** meşə / orman pərisi; **sea ~** dəniz pərisi; **ocean ~** okean / dərya pərisi; **grotto/mountain ~** dağ pərisi; 2. *məc.* balaca / kiçik çay; 3. *şair.* pəri, gözəl qız

**nymphet** ['nɪmfɪt] *n* 1. balaca pəri; 2. yeniyetmə qız uşağı

**nymphomania** [,nɪmfə'meɪnjə] *n tib.* nimfomaniya *(qadınlarda xəstəlik dərəcəsinə çatan ehtiras / qızğınlıq)*

**nymphomaniac** [,nɪmfə'meɪnjək] *n* nimfoman *(həddindən artıq ehtiraslı / qızğın qadın)*






**O, o** [ou] *n* (*pl* **O's, o's** [ouz]) 1. *ingilis əlifbasının 15-ci hərfi; There are two o's in Oxford Oksford sözündə iki o var;* 2. sıfır; *My telephone number is six, o double three (6033) Mənim telefon nömrəm altı, sıfır, iki dənə üçdür (6033)*

**o** [ou] *inter* ox, ah, ay; O dear! Ay Allah!

**o'** [ə] *prep* **of** *sözönünün qısa forması: Would you like a cup o' coffee? Sən/Siz bir fincan qəhvə içərdinmi?/içərdinizmi?*

**oaf** [ouf] *n* (*pl* **oafs**) çirkin / kifir uşaq; axmaq, axmaq/gicbəsər/yöndəmsiz adam; **stupid ~** ağılsız eşşək; *You stupid oaf! Nə axmaq adamsan, əə!*

**oafish** ['oufɪʃ] *adj* 1. axmaq, sərsəm, sərsəri, gicbəsər; 2. təhərsiz; ağır, ləng, iş bacarmayan, yöndəmsiz

**oak**[1] [ouk] *n* 1. *bot.* palıd; 2. palıd oduncağı; *This table is made of oak Bu stol palıddan düzəldilib;* 3. palıd ağacının yarpağından düzəldilmiş əklil

**oak**[2] [ouk] *adj bot.* palıd; **~ tree** palıd ağacı, **~ leaf** palıd yarpağı, **an ~ door** palıd qapı; **an ~ chest** palıd sandıq

**oak-bark** ['oukba:k] *n* palıd qabığı

**oaken** ['oukn] *adj şair.* palıdı, palıd ağacından qayrılmış / düzəldilmiş/hazırlanmış

**oakery** ['oukərɪ] *n* palıdlıq, palıd meşəsi

**oaklet** ['ouklet] *n* cavan palıd ağacı

**oak-tree** ['ouktri:] *n* palıd ağacı

**oak-wood** ['oukwud] *n* palıdlıq, palıd meşəsi

**oaky** ['oukɪ] *adj* palıdı, palıdabənzər; palıd ağacları basmış

**oar**[1] [ɔ:^r] *n* 1. avar, kürək; *Oars! dən. Avarları havada saxla/saxlayın! Avarları qurut/qurudun!;* **to toss ~s** salamlaşmaq əlaməti olaraq avarları yuxarı qaldırmaq; **to pull a good ~** yaxşı avar çəkmək; 2. avarçı, avar-çəkən; **a good ~** yaxşı avarçəkən; 3. avarlı qayıq; **pair/ four of ~s** iki/dörd avarlı qayıq;
◊ **chained to the ~** ağır/üzücü işlə məşğul olan; **to have an ~ in every man's boat** mütəmadi olaraq / həmişə özgəsinin işinə qarışmaq; **to rest / to lie on ~s** boş dayanmaq, iş görməmək, avaralıq etmək; **to put in *one's* ~, to put *one's* ~ in** müdaxilə etmək, qarışmaq; burnunu soxmaq *(söhbətə, başqasının işinə və s.)*

**oar**[2] [ɔ:^r] *v* avar çəkmək; **to ~ *one's* way** avar çəkməklə üzmək; **to ~ *one's* arms or hands** əllərindən və ya qollarından avar kimi istifadə etmək

**oarlock** ['ɔ:lək] *n* avar yeri *(qayıqda)*

**oarsman** ['ɔ:zmən] *n* (*pl* **-men** [-mən]) avarçı, avarçəkən

**oarsmanship** ['ɔ:zmənʃɪp] *n* avarçəkmə qabiliyyəti / ustalığı / bacarığı

**oary** ['ɔ:rɪ] *adj* 1. avarşəkilli; avaraoxşar, avarabənzər; 2. avarı olan

**oases** [ou'eɪsɪ:s] *n* **oasis** *isminin cəm forması*

**oasis** [ou'eɪsɪs] *n* (*pl* **oases** [ou'eɪsɪ:z]) vahə *(səhrada yaşıllıq və su olan yer)*

**oast** [oust] *n* tütün / mayaotu qurutmaq üçün soba

**oast-house** ['ousthaus] *n* mayaotu/tütün qurutmaq üçün dam

**oat**[1] [out] *n* = **oats**

**oat**[2] [out] *adj* yulaf; **~ bran** yulaf kəpəyi; **~ cake** yulaf qoğalı / kökəsi

**oath** [ouθ] *n* 1. and, and içmə, hərbi and; **false ~** yalan and; **judicial ~** məhkəmədə and içmə; **on ~** and içmiş *(hərbdə);* **~ of allegiance** sadiqlik andı; hərbi and; **~ of enlistment** hərbi and *(könüllü olaraq hərbi xidmətə başlananda içilən);* **~ of enlistment** işə girərkən içilən and; *Government employees swear an oath not to reveal official secrets Dövlət məmurları rəsmi sirləri açmamağa and içirlər;* **to make / to take / to swear an ~** and içmək; **to take / to swear an ~ of loyalty to the King** Krala sadiq olmaq haqqında and içmək; **to break an ~** andı pozmaq; 2. Allaha and içmə; **solemn ~** təntənəli and, təntənəli hərbi and; 3. küfr, lənət, söyüş

**oath-breaker** ['ouθ,breɪkə^r] *n* and içdikdən sonra cinayət törədən; andı pozan

**oath-breaking** ['ouθ,breɪkɪŋ] *n* andı/hərbi andı pozma

**oatmeal** ['outmi:l] *n* 1. yulaf unu; 2. yulaf sıyığı; 3. sarı-bozumtul rəng, yulaf rəngi

**oats** [outs] *n bot.* yulaf; *Give the horse some oats Ata bir az yulaf ver / verin; Fields of ripe barley and oats Yetişmiş arpa və yulaf sahələri / zəmiləri;*
◊ **to smell *one's* ~** var qüvvəsini toplamaq *(məqsədə yaxınlaşarkən);* **to feel *one's* ~s** 1) *d.d.* şad / xürrəm / nikbin olmaq; 2) *d.d.* öz gücünü hiss etmək; 3) *d.d.* yuxarıdan getmək, lovğalanmaq; **to be getting *one's* ~** mütəmadi olaraq cinsi əlaqəyə girmək

**obduracy** ['ɔbdʒurəsɪ] *n* 1. ətalət, hərəkətsizlik, durğunluq; 2. islaholunmazlıq; sərtlik, daşürəklilik, mərhəmətsizlik; 3. tərslik, inad, inadcıllıq; inadkarlıq, əyilməzlik, kəclik

**obdurate**[1] ['ɔbdʒurɪt] *adj* 1. ətalətli, islaholunmaz, düzəlməz, inadkar; 2. sərtlik, daşürəkli, mərhə-mətsiz; amansız, azğın; qızğın; 3. tərs, inadkar, inadcıl, əyilməz, kəc

**obdurate**[2] ['ɔbdʒureɪt] *v* sərtləşdirmək, amansızlaşdırmaq, mərhəmətsizləşdirmək, qızğın-

laşdırmaq, şiddətləndirmək; kəskinləşdirmək; inadlaşdırmaq, inadcıl / inadkar etmək

**obdurately** ['ɔbdʒurıtlı] *adv* **1.** sərt, amansız, aman-sızlıqla, amansızcasına, amansız / mərhəmətsiz surətdə; **2.** tərsliklə, inadla, tərs-tərs

**obedience** [ə'bi:dıəns] *n* **1.** itaət, itaətkarlıq, itaət etmə; tabe olma, sözə baxma; **to demand** ~ itaətkarlıq tələb etmək; **to show** ~ itaət etmək, itaətkarlıq göstərmək, sözə baxmaq; **to instil** ~ **in** *smb.* kiməsə itaətkarlıq təlqin etmək; **to pledge/to swear** ~ **to** *smb.* bir kəsə itaət etmə haqqında söz vermək; **blind** ~ kor-koranə itaət; **strict** ~ tam tabelik / itaət; **2.** *kils.* itaət etmə; *hər bir rahibin monastırda görməli olduğu iş / vəzifə*

**obedient** [ə'bi:dıənt] *adj* itaətkar, tabe olan, itaətli, sözə baxan / qulaq asan, üzüyola; müti; **an** ~ **child** sözə qulaq asan / üzüyola uşaq; *His dog is very obedient Onun iti çox itaətkardır;* **your** ~ **servant** bəndəniz *(rəsmi məktubun sonunda yazılır)*

**obediently** [ə'bi:dıəntlı] *adv* itaətkarcasına, itaətlə, itaətkarlıqla, acizanə; *He whistled, and his dog came obediently O, fit çaldı və it itaətkarcasına gəldi*

**obedientiary** [ə.bi:dı'enʃərı] *n* kilsədə hər hansı iş yerinə yetirən adam

**obeisance** [ou'beısns] *n* **1.** baş əymə, reverans *(əyilərək salam vermə);* tabelik jesti; **to make** *one's* ~ baş əymək; **2.** hörmət, izzət; **to do / to pay** ~ **to** *smb.* kiməsə hörmət göstərmək / etmək

**obelisk** [ɔ'bılısk] *n* obelisk, *(sütun şəklində daş abidə / yaddaş lövhəsi);* **to put up an** ~ obelisk ucaltmaq

**obese** [ou'bi:s] *adj* şişman, kök, dolğun, koppuş, piyləşmədən əziyyət çəkən; *She is grossly obese O həddən çox kökdür / şişmandır; Obese patients are advised to change their diet Kök xəstələrə yeməklərini dəyişmək məsləhət görülür*

**obesity** [ou'bi:sıtı] *n* köklük, tosqunluq, şişmanlıq, piylənmə, piy basma, həddindən artıq kökəlmə; *Obesity can increase the risk of heart disease Köklük / Piylənmə ürək xəstəliyinə tutulma riskini/ təhlükəsini artıra bilər*

**obey** [ə'beı] *v* **1.** tabe olmaq, riayət etmək; **to** ~ **the rule** qaydaya riayət etmək; **to** ~ **the law** qanuna tabe olmaq; *Soldiers are trained to obey without question Əsgərləri sorğu-sualsız itaət etməyə / tabe olmağa öyrədirlər;* **2.** əməl etmək, yerinə yetirmək; **to** ~ **orders** əmrləri /sərəncamları yerinə yetirmək, əmrlərə/sərəncamlara əməl etmək; **3.** *riyaz.* bərabərliyin şərtlərinə cavab vermək

**obeyingly** [ə'beıŋlı] *adv* itaətkarcasına, itaətlə, itaətkarlıqla, acizanə; tabe olaraq

**obfuscate** ['ɔbfʌskeıt] *v* **1.** *arx.* çaşdırmaq, karıxdırmaq, çətinliyə salmaq, çətin / çıxılmaz vəziyyətə salmaq; tündləşdirmək, qaraltmaq; **2.** *mac.* küncə qısnamaq; ağlını dumanlandırmaq

**obituarist** [ə'bıtjuərıst] *n* nekroloqun müəllifi

**obituary**[1] [ə'bıtjuərı] *n* **1.** nekroloq; **to write an** ~ nekroloq yazmaq; **to print / to publish an** ~ nekroloq çap / dərc etmək; **to read the obituaries** nekroloqları oxumaq; *He writes obituaries for the local newspaper O, yerli qəzetə nekroloqlar yazır;* **2.** *kils.* ölənlərin siyahısı

**obituary**[2] [ə'bıtjuərı] *adj* **1.** dəfn; dəfnə aid; ~ **ceremony** dəfn mərasimi; **2.** nekroloji; ~ **notice** nekroloq

**object**[1] ['ɔbdʒıkt] *n* **1.** əşya, şey, obyekt; **material / physical** ~ maddi / fiziki obyekt / şey; **an** ~ **of interest/fear** maraq/qorxu doğuran şey; *I see an object in the distance Mən uzaqda bir obyekt / şey görürəm;* **Unidentified Flying Object** Uçan Naməlum Obyekt; **2.** obyekt; **an** ~ **for study** tədqiqat obyekti; **the** ~ **of my affection** mənim tədqiqatımın obyekti; **3.** məqsəd, məram; **the** ~ **of his visit** onun səfərinin məqsədi, **the** ~ **of** *one's* **life** həyatının məqsədi / məramı; **to have no** ~ **in life** həyatda heç bir məqsədi / məramı olmamaq; **to achieve / to attain / to gain** *one's* ~ məqsədinə nail olmaq / çatmaq; **to fail in** *one's* ~ məqsədinə nail olmamaq/çatmamaq; *What is the object of doing that ? Bunu etməkdə məqsədin/məqsədiniz nədir? Their object is to investigate the matter thoroughly Onların məqsədi bu işi əsaslı / ətraflı surətdə tədqiq etməkdir;* **to fail in** ~ məqsədə nail olmamaq; **to succeed in** ~ məqsədə nail olmaq; **4.** *qram.* tamamlıq; **direct** ~ vasitəsiz tamamlıq; **indirect** ~ vasitəli tamamlıq; **prepositional** ~ sözönlü tamamlıq; **5.** *fəls.* obyekt *(subyektin əksi)*

**object**[2] [əb'dʒekt] *v* **1.** etiraz etmək, protestlə çıxış etmək; **to** ~ **strenuously / strongly** qəti / kəskin etiraz bildirmək; **to** ~ **to new taxes** yeni vergilərə qarşı etiraz etmək; *No one objected Heç kəs etiraz etmədi; She objected that the accusation was based on hearsay O, ittihamnamənin şayiə əsasında qurulmasına qarşı etirazını bildirdi; They objected that the price was too high Onlar çox baha qiymətlərə qarşı etiraz etdilər; I think I'll have a smoke, if you don't object Etiraz etmirsənsə/ etmirsinizsə, mən bir siqaret çəkərdim; You should have objected in time Sən / Siz gərək vaxtında etiraz edəydin / edəydiniz;* **2. (to)** xoşu gəlməmək, sevməmək, mənfi/pis yanaşmaq; *I object very much to a wet summer Mən yağmurlu yayı sevmirəm, Mənim yağmurlu yaydan xoşum gəlmir*

**object-finder** ['ɔbdʒıkt.faındə'] *n fot.* vizir, nişanlayıcı

**object-glass** ['ɔbdʒıktgla:s] *n fot.* obyektiv

**objectify** [əb'dʒektıfaı] *v (pt, pp* **-fied***)* **1.** təcəssüm etmək; təsvir / ifadə etmək; **2.** obyektiv səbəblərə istinad etmək

**objection** [əb'dʒekʃn] *n* **1.** etiraz, protest *(əsas etibarı ilə hüquqi termin);* **to deal with** ~, **to meet an** ~ etirazla qarşılaşmaq / üzləşmək; **to raise**



**an** ~ **to a proposal** təklifə qarşı etiraz etmək; **serious / strenuous / strong / violent / vociferous** ~ ciddi/ kəskin etiraz; **valid** ~ qanuni / ədalətli etiraz; *Objection overruled / sustained Etiraz rədd edilir / qəbul edilir; We have no objections to your going Sizin getməyinizə bizim heç bir etirazımız yoxdur; The judge overruled their objection Hakim onların etirazını rədd etdi;* **to withdraw an** ~ etirazı geri götürmək; **2.** *mac.* bəyənməmə, rədd etmə; **3.** qüsur, çatışmazlıq; *The chief objection of the book is its great length Kitabın başlıca qüsuru / çatışmazlığı onun çox uzunçuluğudur*

**objectionable** [əb'dʒekʃnəbl] *adj* **1.** xoşagəlməz, iyrənc, pis, nifrət oyadan; ~ **smell** pis / xoşagəlməz / iyrənc iy; ~ **behaviour** pis / xoşagəlməz/ qəbahətli davranış; **2.** arzuolunmaz, etiraz doğuran, etiraza səbəb olan; **to be least** ~ ən az etiraz doğuran; ~ **plan** etiraza səbəb olan plan; *I myself didn't find anything objectionable in his behaviour Mən şəxsən onun davranışında qəbahətli / eyibli / xoşagəlməz heç bir şey tapmadım;* **3.** dəhşətli; *The crocodiles are most objectionable beasts Timsahlar ən dəhşətli heyvandır*

**objective**[1] [əb'dʒektıv] *n* **1.** məqsəd, hədəf; amal, istək; vəzifə, tapşırıq; **economic** ~ iqtisadi məqsəd; **long-range** ~ uzunzamanlı/ uzunmüddətli məqsəd; **military** ~ hərbi hədəf; **to attain an** ~, **to gain an** ~, **to win an** ~ məqsədə çatmaq; **2.** *hərb.* obyekt *(hücum etmək üçün);* **3.** *qram.* vasitəli hal; **4.** *opt.* obyektiv

**objective**[2] [əb'dʒektıv] *adj* **1.** obyektiv, real; maddi *(şüurumuzdan asılı olmayaraq mövcud olan);* ~ **reality** obyektiv reallıq; ~ **data** obyektiv rəqəmlər; *Dragons have no objective existence Əjdahalar real həyatda mövcud deyil;* **2.** *tib.* obyektiv *(simptomlar haq.);* **3.** *fəls.* obyektiv, mövcud, real; ~ **method** induktiv üsul/metod; **4.** qərəzsiz, obyektiv, insaflı, ədalətli; **an** ~ **study** obyektiv tədqiqat; **an** ~ **history of the war** müharibənin obyektiv tarixi; **an** ~ **judgement** qərəzsiz mühakimə; **5.** məqsədli, məqsədə aid; ~ **point** son məqsəd; *hərb.* hərəkətin məqsədi, hərəkətin obyekti; **6.** *qram.* tamamlığa aid olan; ~ **case** vasitəli hal

**objectivism** [əb'dʒektıvızm] *n* **1.** obyektivliyə can atma **2.** *fəls.* obyektivizm; obyektiv reallığın mövcudluğunu etiraf etmə

**objectivity** [.ɔbdʒek'tıvıtı] *n* obyektivlik, qərəzsizlik, insaflılıq, ədalətlilik, bitərəflik; **in all** ~ bütün obyektivliyi ilə

**objectless** ['ɔbdʒıktlıs] *adj* məqsədsiz, boş, əsassız, məzmunsuz, mənasız

**objector** [əb'dʒektə'] *n* etiraz edən şəxs; **conscientious** ~ *dini və mənəvi səbəblər üzündən hərbi xidmətdən imtina edən şəxs*

**objurgate** ['ɔbdʒə:'geıt] *v* irad tutmaq, danlamaq, sitəm etmək/vermək

**objurgation** [.ɔbdʒə:'geıʃn] *n* irad, danlaq, sitəm

**objurgatory** [əb'dʒə:gətərı] *adj* iradlı, sitəmli

**oblate** ['ɔbleıt] *adj* **1.** *kils.* özünü kilsə həyatına həsr etmiş; **2.** *hənd.* yastılanmış *(qütblərdə);* ~ **ellipsoid** *riyaz.* yastılanmış *(sıxılmış)* ellipsoid; ~ **parabola** *riyaz.* yastılanmış *(sıxılmış)* parabola

**oblateness** [əb'leıtnıs] *n* **1.** yastılıq; **2.** *hənd.* yastılıq; **3.** sıxılmışlıq; **4.** sıxılma; **first-order** ~ *hənd.* birinci dərəcə sıxılma

**oblation** [ou'bleıʃn] *n* **1.** qurbanvermə; kilsəyə və ya xeyriyyə məqsədi ilə nəzir vermə; **2.** qurban, pay *(Allaha);* **3.** *kils.* tövbə etmə, təmizlənmə

**oblational** [ou'bleıʃnl] *adj* qurbanlıq, ~ **sheep** qurbanlıq qoyun

**oblatory** ['ɔblətərı] *adj* = **oblational**

**obligate** ['ɔblıgeıt] *v* məcbur/vadar/təhrik etmək, öhdəsinə qoymaq; *What does the agreement obligate us to do? Saziş bizim üzərimizə hansı öhdəliyi qoyur?*

**obligation** [.ɔblı'geıʃn] *n* **1.** təəhhüd, öhdəlik, öhdəçilik; **to undertake/to assume** ~**s** öhdəçilik/öhdəlik qəbul etmək/götürmək; **international** ~**s** beynəlxalq öhdəçiliklər; **treaty** ~**s** sazişə görə öhdəçiliklər; **government** ~ dövlət öhdəçiliyi; **to cancel an** ~ öhdəçiliyi ləğv etmək; **to carry out / to fulfil** ~**s** öhdəçilikləri yerinə yetirmək; **to deny /to renounce** ~**s** öhdəçiliklərdən imtina etmək; **to impose an** ~ **on** *smb.* öhdəçiliyi kiminsə üzərinə qoymaq; **long-term** ~ uzunmüddətli öhdəçilik; **short-term** ~ qısamüddətli öhdəçilik; **2.** borc; vəzifə; **to feel an** ~ özünü borclu hiss etmək; **to discharge / to fulfil / to meet an** ~ borcu yerinə yetirmək ; **legal** ~ hüquqi mükəlləfiyyət; **moral** ~ mənəvi borc ; **social** ~ ictimai borc; **family** ~**s** ailə vəzifələri; ~ **to** *one's* **parents** valideynləri qarşısında borc; *We have an obligation to help them Onlara kömək etmək bizim borcumuzdur;* **3.** məcburi qüvvə, məcburiyyət *(qanun, saziş və s.),* mükəlləfiyyət; **military** ~ hərbi mükəlləfiyyət; **4.** göstərilmiş nəzakət; minnətdarlıq hissi; **default on an** ~ öhdəçiliyin/öhdəliyin yerinə yetirilməməsi; **contract an** ~ üzərinə öhdəçilik / öhdəlik götürmə; **bond of** ~ *hüq.* möhürlə təsdiq edilmiş borc iltizamı; **assumption / assume of (an)** ~ öz üzərinə öhdəçiliyin götürülməsi; **payment** ~ ödəmə iltizamı

**obligator** [.ɔblı'geıtə'] *n* **1.** öhdəçilik verən şəxs; **2.** borcu olan şəxs

**obligatory** [ɔ'blıgətrı] *adj* məcburi, icbari, mütləq, vacib; *Lectures are obligatory for all students Mühazirələr bütün tələbələr üçün məcburidir;* ~ **tasks** məcburi/icbari tapşırıqlar *(dövlət səviyyəsində)*

**oblige** [ə'blaıdʒ] *v* məcbur / vadar etmək, öhdəsinə qoymaq, bağlamaq *(sazişlə, andla);* **to be** ~**d** *d.d.* minnətdar olmaq; *I am much obliged (to*

*you) Sənə / Sizə çox minnətdaram; We are obliged for your letter of the 15th of May 15 may tarixli məktubunuza görə sənə / sizə minnətdarıq*

**obligee** [ˌɔblɪ'dʒiː] *n hüq.* 1. haqqında öhdəçilik götürülmüş şəxs; 2. kreditor, kredit/borc verən *(adam)*

**obliging** [ə'blaɪdʒɪŋ] *adj* 1. mütləq, məcburi; 2. nəzakətli, məsuliyyətli, işə ciddi yanaşan, işə yarayan, əl tutan; ~ **neighbours** nəzakətli/işə yarayan / əl tutan qonşular

**obligingly** [ə'blaɪdʒɪŋlɪ] *adv* nəzakətlə, gülərüzlə, iltifatla, mehribanlıqla, lütfkarlıqla

**obligingness** [ə'blaɪdʒɪŋnɪs] *n* 1. məcburilik; 2. nəzakətlilik, qayğıkeşlik, lütfkarlıq, iltifatlılıq

**oblique**[1] [ə'bliːk] *n* çəpəki xətt *(rəqəmləri, sözləri və s. bir-birindən ayırmaq üçün)*

**oblique**[2] [ə'bliːk] *adj* 1. çəp, çəpəki; ~ **glance / look** çəpəki baxış; ~ **arch** çəp /çəpəki tağ; ~ **section** çəp / çəpəki kəsik; 2. dolayı; **an ~ hint** dolayı eyham; 3. vasitəli; ~ **speech** vasitəli nitq; ~ **moods** vasitəli şəkillər *(feldə)*

**oblique**[3] [ə'bliːk] *v* 1. *hərb.* çəpinə hərəkət etmək; *They gradually obliqued from the direct ascent Onlar yavaş-yavaş düz istiqamətli marşrutdan kənara çıxırdılar;* 2. bucaq altında olmaq *(həndəsi xətt)*

**oblique-angled** [ə'bliːk'æŋgld] *n riyaz.* çəpbucaqlı

**obliquely** [ə'bliːklɪ] *adv* 1. çəpinə, çəp, çəpəki, köndələn, qıyğacı; perpendikulyar 2. dolayı, bilvasitə; qismən, müəyyən dərəcədə

**obliquity** [ə'blɪkwɪtɪ] *n* 1. düz xəttdən kənara çıxma; əyri istiqamət, maili vəziyyət; 2. doğru yoldan çıxma / sapma; ~ **of conduct** əxlaqdan sapma; ~ **of mind** sağlam düşüncədən sapma / kənara çıxma; ~ **of judgement** məhkəmə qərarının yanlışlığı / doğru olmaması; 3. *tex.* əyrilik, konusluluq; 4. *astr.* əyrilik *(orbitdə)*

**obliterate**[1] [ə'blɪtərɪt] *adj şair.* silinmiş, pozulmuş, sürtülüb pozulmuş / silinmiş; məhv edilmiş; unudulmuş

**obliterate**[2] [ə'blɪtəreɪt] *v* 1. silmək, pozmaq, sürtüb pozmaq / silmək; məhv etmək; **to~ *one's* signature** imzasını pozmaq; **to~ *one's* footprints / tracks** izini silmək / sürtüb təmizləmək; **to ~ completely / entirely/totally / utterly** tamamilə / büsbütün məhv etmək; 2. unutmaq, yaddan çıxarmaq; *All feelings of hatred had long been obliterated Nifrət hissi çoxdan unudulmuşdu / yaddan çıxarılmışdı; She tried to obliterate the memory of her childhood O, uşaqlıq xatirələrini unutmağa çalışdı*

**obliteration** [əˌblɪtə'reɪʃn] *n* 1. silmə; ləğv / məhv/ yox etmə; heçə çıxarma; 2. pozma, silmə, pozulma, silinmə; 3. unutma, yaddan çıxartma

**oblivion** [ə'blɪvɪən] *n* 1. unutma, yaddan çıxartma; **to fall / to sink into** ~ unudulmaq, yaddan çıxarılmaq; *His work fell / sank into oblivion after his death Ölümündən sonra onun işi unuduldu;* 2. bağışlanma, bağışlama, əfv etmə, amnistiya; **Act (Bill) of Oblivion** Amnistiya, Əfv haqqında fərman; 3. bihuş / sərxoş olma; **to drink oneself into** ~ içib bihuş / sərxoş olmaq; **to slip / to sink into** ~ huşunu itirmək, bihuş olmaq

**oblivious** [ə'blɪvɪəs] *adj* 1. unutqan, yaddaşsız; ~ **of *one's* duties** (öz) vəzifəsini unudan; 2. diqqətsiz, laqeyd, diqqət yetirməyən/verməyən; huşsuz, fikri dağınıq, dalğın; *Happily for him, he was soon oblivious of this Xoşbəxtlikdən, o bunu tez unutdu; She was oblivious of what was going on O, ətrafda nələr baş verdiyini hiss etmirdi;* ~ **of *one's* surroundings** ətrafında baş verənləri dərk etməmə; ~ **to danger** təhlükəyə laqeyd / fikir verməyən / biganə

**obliviousness** [ə'blɪvɪəsnɪs] *n* unutqanlıq, yaddaşsızlıq, huşsuzluq, dalğınlıq

**oblong**[1] ['ɔblɔŋ] *n* 1. uzunsov şey / əşya / fiqur; 2. *hənd.* düzbucaqlı, uzunu enindən çox olan

**oblong**[2] ['ɔblɔŋ] *adj* 1. uzunsov, uzunvari; ~ **recess** uzunsov taxça; ~ **ellipsoid** *riyaz.* uzunsov ellipsoid 2. düzbucaqlı; ~ **yard** düzbucaq formalı həyət; ~ **mirror** düzbucaqlı güzgü

**oblongness** [ɔb'lɔŋnɪs] *n* uzunsovluq

**obloquious** ['ɔbləkwɪəs] *adj* təhqiredici, həqarətli, alçaldıcı; rüsvayçı, rüsvay edən

**obloquy** ['ɔbləkwɪ] *n* 1. qeybət, qeybət etmə; dedi-qodu, dalca danışma; 2. təhqir, təhqir etmə / edilmə, həqarət; acı söz, sitəm; **to heap ~ upon *smb.*** bir kəsi təhqir etmək; 3. biabırçılıq, rüsvayçılıq, bədnamlıq, üzüqaralıq

**obnoxious** [əb'nɔkʃəs] *adj* 1. dözülməz, pis, iyrənc, mənfur, murdar, nifrət oyadan, xoşagəlməz; ~ **habit** iyrənc / dözülməz adət; ~ **smell** pis/iyrənc/dözülməz iy, üfunət; 2. təhqiramiz, qərəzli; ~ **remarks** təhqiramiz qeydlər /iradlar

**obnoxiously** [əb'nɔkʃəslɪ] *adv* 1. pis, xoşa gəlməyəcək bir halda, iyrənc; 2. təhqiredici bir şəkildə/halda, həqarətlə

**oboe** ['oubou] *n* qaboy *(musiqi aləti)*; **to play the** ~ qaboy çalmaq

**oboist** ['oubouɪst] *n* qaboyçu, qaboyçalan

**obscene** [ɔb'siːn] *adj* abırsız, ədəbsiz, həyasız, nalayiq, yaramaz, yaraşmaz, ləyaqətsiz, əxlaqsız; biabırçı, vulqar; pornoqrafik; kobud; ~ **pictures** biabırçı/pornoqrafik şəkillər; ~ **language** yaramaz/abırsız/nalayiq söyüş; ~ **gestures** ədəbsiz/abırsız/nalayiq/yaraşmaz hərəkətlər; ~ **books** nalayiq/yaramaz kitablar; ~ **films** nalayiq/biabırçı/pornoqrafik filmlər; ~ **material** pornoqrafik materiallar

**obscenely** [ɔb'siːnlɪ] *adv* abırsız, ədəbsiz, ədəbsizcəsinə, həyasız, həyasızcasına, nalayiq, nalayiqcəsinə, ləyaqətsizcəsinə, utanmadan, həya etmədən, əxlaqsızcasına; **to behave** ~ özünü həyasız / ədəbsiz aparmaq

**obsceneness** [ɔb'siːnnɪs] *n* = **obscenity**

**obscenity** [ɔb'siːnɪtɪ] *n* abırsızlıq; ədəbsizlik,



həyasızlıq, nalayiqlik, ləyaqətsizlik, əxlaqsızlıq; biabırçılıq; biabırçı söyüşlər; **to scrabble obscenities on the wall** divarda abırsız / ədəbsiz / biabırçı sözlər yazmaq

**obscurant**[1] [ɔb'skjuərənt] *n* cahil, cəhalətpərəst, tərəqqi / maarif düşməni; mövhumatçı

**obscurant**[2] [ɔb'skjuərənt] *adj* cahil, cəhalətpərəst, ~ **views** cəhalətpərəst baxışlar

**obscurantism** [ˌɔbskjuə'ræntɪzm] *n* cəhalət, cahillik, cəhalətpərəstlik, maarifə düşmənçilik; **the struggle of science against religious** ~ elmin dini cəhalətə qarşı mübarizəsi

**obscurantist** [ˌɔbskjuə'ræntɪst] *n* = **obscurant**[1]

**obscuration** [ˌɔbskjuə'reɪʃn] *n* 1. havalanma, ağlı çaşma; 2. *astr.* tutulma *(ay, gün);* 3. tutqunlaşdırma

**obscure**[1] [əb'skjuə<sup></sup>] *adj* 1. qaranlıq, pis işıqlandırılmış, sönük; ~ **lobby** qaranlıq dəhliz; ~ **corner of a room** otağın qaranlıq küncü; **misty and ~ day** dumanlı və tutqun gün; 2. anlaşılmaz, aydın olmayan, naməlum, dumanlı, qarışıq, dolaşıq, qeyri-müəyyən, qeyri-dəqiq, tutqun; ~ **sound** anlaşılmaz səs; ~ **motives** anlaşılmaz / dolaşıq səbəblər; ~ **pulse** zəif hiss edilən nəbz; ~ **feelings** dolaşıq / qarışıq hisslər; ~ **explanation** dolaşıq / dumanlı / anlaşılmaz izahat; ~ **style** anlaşılmaz üslub; *The part he played in the matter remains obscure Onun bu məsələdə oynadığı rol anlaşılmaz qalır; The origins of many words are still obscure Çox sözlərin mənşəyi hələ də naməlumdur / anlaşılmır;* 3. nəzərə çarpmayan, görünməyən, seçilməyən, az tanınan, heç bir şeylə məşhur olmayan; **an ~ book of a forgotten author** unudulmuş müəllifin az tanınan kitabı; **an ~ German poet** az tanınan alman şairi; 4. uzaq, ucqar, əldən-ayaqdan uzaq; **an ~ village** ucqar kənd / əyalət; *He settled in an obscure village O, uzaq / ucqar bir kənddə məskunlaşdı*

**obscure**[2] [əb'skjuə] *v* 1. qabağını kəsmək / tutmaq, örtmək, pərdələmək, çulğamaq, kölgə salmaq; **windows ~d by curtains** pərdə ilə örtülmüş pəncərələr; *The Moon / The Sun was obscured by clouds Buludlar ayın / günəşin qabağını tutdu;* 2. dolaşdırmaq, dolaşıq salmaq, qarışdırmaq, qarışıq salmaq; *His testimony obscured the issue Onun şəhadəti / ifadəsi məsələni dolaşdırdı;* **to ~ the meaning of the word** sözün mənasını qarışdırmaq / anlaşılmaz etmək; 3. kölgədə qoymaq / buraxmaq; *His fame was obscured by that of his son Oğlunun şöhrəti onun şöhrətini kölgədə qoydu;* 4. qabağını kəsmək / tutmaq *(işığın)*; **to ~ the light** işığın qabağını kəsmək / tutmaq

**obscurely** [əb'skjuəlɪ] *adv* 1. anlaşılmaz tərzdə / surətdə, üstüörtülü; tutqun; 2. anlaşılmaz / qarışıq / dolaşıq bir tərzdə; **to speak ~** anlaşılmaz bir tərzdə danışmaq

**obscurity** [əb'skjuərɪtɪ] *n* 1. zülmət, qaranlıq, pis işıqlanma; **to sink into ~** zülmətə / qaranlığa qərq olmaq; 2. aydın/ aşkar / bəlli olmama, anlaşılmazlıq; **the ~ of the style** üslubun anlaşılmazlığı; 3. qəribə insan, naməlum şəxs; *He married this poor, young obscurity O bu kasıb, cavan naməlum qızla evləndi;* 4. naməlumluq; tanınmama, şöhrətsizlik, adsızlıq; **to live in ~** tanınmadan/şöhrətsiz yaşamaq; **to sink / to lapse into ~** unudulmaq, yaddan çıxmaq; **to spring / to rise / to emerge from ~** gözlənilmədən/qəflətən şöhrət /ad-san qazanmaq; 5. aydın olmayan / anlaşılmayan parça / yer *(mətndə, nitqdə və s.);* **the obscurities of Greek poets** qədim yunan şairlərinin əsərlərində aydın olmayan parçalar/ yerlər; **a philosophical essay full of obscurities** anlaşılması çətin parçalarla / yerlərlə dolu olan fəlsəfi oçerk

**obsecration** [ˌɔbsɪ'kreɪʃn] *n* 1. yalvarış, yalvarma, and, and vermə; 2. dua, yalvarma *(Allaha)*

**obsequial** [ɔb'siːkwɪəl] *adj* yas, dəfn; ~ **rites** yas / dəfn adətləri / qaydaları / mərasimi

**obsequies** ['ɔbsɪkwɪz] *n* basdırılma, torpağa tapşırılma

**obsequious** [əb'siːkwɪəs] *adj* 1. yaltaq, qulluq göstərən, quyruq bulayan; **to give an ~ smile** yaltaqcasına gülümsəmək; **most ~ politeness** yaltaqlıq dərəcəsinə çatan nəzakət / nəzakətlilik; **to be ~ to/with *smb.*** kiminsə qarşısında əyilmək, bir kəsə yaltaqlıq etmək; 2. *arx.* itaətkar, sözə baxan / qulaq asan, üzüyola

**obsequiously** [əb'siːkwɪəslɪ] *adv* yaltaqcasına, köləcəsinə, qul / kölə kimi, itaətkarcasına

**obsequiousness** [əb'siːkwɪəsnɪs] *n* yaltaqlıq, itaətkarlıq, alçalma, qulluq göstərmə; quyruq bulama; köləcəsinə səcdə / sitayiş etmə

**observable** [əb'zəːvəbl] *adj* 1. görünən, nəzərə çarpan, gözə dəyən / görünən, diqqəti cəlb edən, müşahidə edilə / oluna bilən; **any ~ object** gözə dəyən / çarpan hər hansı bir şey / obyekt; 2. riayət edilməli, əməl olunmalı, yerinə yetirilməli; ~ **holiday** əməl olunmalı bayram; 3. diqqətəlayiq, baxmalı, görməli, maraqlı; *We met with nothing observable Biz diqqətəlayiq / maraqlı heç nəyə rast gəlmədik*

**observance** [əb'zəːvns] *n* 1. riayət etmə / edilmə, əməl etmə / edilmə, yerinə yetirmə / yetirilmə *(adət, ənənə, qanun haq.)*; ~ **of treaty** müqaviləyə riayət etmə; 2. adət, ənənə, qayda, ayin, mərasim; **religious ~** dini ayin/adət; **to maintain the customary ~s** mövcud adətlərə riayət / əməl etmək

**observancy** [əb'zəːvnsɪ] *n* müşahidəçilik, müşahidə qabiliyyəti, diqqətlilik

**observant** [əb'zəːvnt] *adj* 1. diqqətli, müşahidə edən, seçən, hər şeyə fikir verən / diqqət yetirən; **an ~ child** diqqətli / hər şeyə fikir verən uşaq; *Journalists are trained to be observant Jurnalistlərə müşahidəçi olmağı öyrədirlər;* 2. riayət

edən, yerinə yetirən *(qanunu və s.)*; **~ of customs** adətlərə riayət edən, adətləri yerinə yetirən

**observation**[1] [.ɔbzə'veıʃn] *n* **1.** müşahidə, müşahidə etmə / aparma; **personal / scientific / empiric ~** şəxsi / elmi/ empirik müşahidə; **~ of natural phenomena** təbiət hadisələrinin müşahidə edilməsi; **close and careful ~ of an animals' behaviour** heyvanların davranışını yaxından və ehtiyatla müşahidə etmə; **2.** nəzarət, nəzarət etmə; **to keep under ~** nəzarət altında saxlamaq; *The patient was kept under observation all night Xəstə bütün gecəni nəzarət altında saxlandı, Xəstəyə bütün gecə nəzarət edildi;* **3.** müşahidəçilik, müşahidə qabiliyyəti; diqqətlilik; **a man of keen ~** iti müşahidəçilik qabiliyyəti olan adam; **a man of little ~** müşahidəçilik qabiliyyəti zəif olan adam; diqqətsiz adam; **4.** *hərb.* kəşfiyyat, müşahidə; **5.** riayət etmə *(qanuna, adətlərə, qaydaya və s.)* ; **~ of laws / customs** qanunlara/adətlərə riayət etmə; **6.** fikir, mülahizə; **to make an ~ on** *smth.* bir şey haqqında fikir / rəy söyləmək; *He didn't make a single observation during the whole discussion O bütün müzakirə zamanı heç bir fikir söyləmədi* **7.** kəlam, qeyd; **astute / keen / penetrating / shrewd ~** müdrik kəlam, yerli-yerində edilmiş qeyd

**observation**[2] [.ɔbzə'veıʃn] *adj* müşahidə; **~ post / tower / platform / station** müşahidə postu / qülləsi/platforması / məntəqəsi; **~ aircraft** havadan müşahidə aparmaq üçün təyyarə; **~ data** müşahidə məlumatları

**observatory** [əb'zə:vətrı] *n* **1.** rəsədxana; **seismic ~** seysmoloji rəsədxana; **astronomical ~** astronomik rəsədxana; **extraterrestrial ~** kosmik rəsədxana; **hydrometeorological ~** hidrometeoroloji rəsədxana; **orbiting ~** orbital rəsədxana; **floating ~** üzücü rəsədxana; **~ satellite** peyk-rəsədxana; **2.** müşahidə məntəqəsi, müşahidə meydançası

**observe** [əb'zə:v] *v* **1.** müşahidə etmək, izləmək *(nəzərlə)*; **to ~ attentively / carefully / closely** diqqətlə /ehtiyyatla/ yaxından müşahidə etmək / izləmək; **to ~ the habits of ants / the behaviour of birds** quşların davranışını / qarışqaların vərdişlərini müşahidə etmək; **2.** görmək; *The police observed the man entering / enter the bank Polis kişinin banka girdiyini gördü;* **3.** riayət etmək *(qanuna və s.)*, ciddi əməl etmək *(qaydaya və s.)*; **to ~ the speed limit** sürət məhdudiyyətinə riayət etmək / ciddi əməl etmək; **to ~ the time** vaxta əməl etmək, dəqiq olmaq; **4.** bayram etmək, təntənəli mərasim keçirmək, təntənəli surətdə qeyd etmək; *Do they observe Christmas? Onlar Milad bayramını qeyd edirlərmi?; Christmas is now observed in Scotland much more than formerly İndi Şotlandiyada Milad bayramı əvvəllər olduğundan daha təntənəli surətdə qeyd edilir;* **5.** elmi müşahidə aparmaq; **6.** demək, qeyd etmək; *He observed that it would probably rain O dedi ki, ola bilsin ki, yağış yağsın;*
◊ *If we observe that... Bunu qeyd edərək...*

**observed** [əb'zə:vd] *adj* müşahidə edilmiş/olunmuş, müşahidə yolu / üsulu ilə əldə edilmiş; **~ result** müşahidənin nəticəsi; müşahidə yolu /üsulu ilə əldə edilmiş nəticə

**observer** [əb'zə:vəʳ] *n* **1.** müşahidəçi; **casual ~** təsadüfi şahid; **impartial ~** qərəzsiz müşahidəçi; **keen / perceptive ~** diqqətli müşahidəçi; **outside ~** kənar müşahidəçi; **shrewd ~** çox diqqətli müşahidəçi; **military ~** hərbi müşahidəçi; **2.** müşahidəçi, dinləyici, müşahidəçi kimi iştirak edən *(simpoziumda, konfransda iştirak edən, lakin onun işinə qarışmayan)*; **~ at a summit** dövlət başçılarının görüşündə müşahidəçi; **to send** *smb.* **along as an ~** bir kəsi müşahidəçi / dinləyici kimi göndərmək; **3.** bir şeyə riayət / əməl edən adam; nəyəsə riayət edən insan; **rigorous ~s of the law** qanunun əsl tərəfdarları, **an ~ of his promises** vədinə əməl edən adam; **4.** icmalçı *(qəzetdə)*

**observering** [əb'zə:vıŋ] *adj* **1.** müşahidəçi, diqqətli, hər şeyə fikir verən / diqqət yetirən; **2.** elmi müşahidələr aparan

**obsess** [əb'ses] *v* **1.** izləmək, təqib etmək, əziyyət vermək *(fikir, qorxu və s.)*; *The idea that he might lose his position obsessed him İşini itirə biləcəyi fikri ona əziyyət verirdi;* **to be ~ed by / with the fear of death** ölüm qorxusundan əziyyət çəkmək; **2.** hakim kəsilmək; *She's obsessed by the desire to become a great scientist Böyük alim olmaq arzusu ona hakim kəsilmişdi*

**obsession** [əb'seʃn] *n* **1.** beyindən çıxmayan/ beyinə girmiş/hakim kəsilən fikir/ideya; **2.** mübtəlalıq, mübtəla olma; yaddan çıxmama; müəmma, sirr

**obsessional** [əb'seʃənl] *adj* beyindən çıxmayan/ beyinə girmiş/ hakim kəsilmiş; **~ love** beyindən çıxmayan/ beyinə girmiş məhəbbət; **~ behaviour** hakim kəsilən davranış

**obsessive** [əb'sesiv] *adj* = **obsessional**

**obsolescence** [.ɔbsə'lesns] *n* **1.** köhnəlmə; gerilik; **economic ~** iqtisadi gerilik; **2.** *biol.* hər hansı heyvan növünün tədricən yox olması; orqanın tədrici məhvi; **3.** *tex.* mənəvi köhnəlmə *(avadanlıq, ləvazimat və s. haq.)*; **~ period** qurğunun mənəvi uzunömürlülük müddəti

**obsolescent** [.ɔbsə'lesnt] *adj* **1.** istifadədən çıxan; köhnələn; **~ technology** köhnələn texnologiya; **~ words** köhnələn/istifadədən çıxan sözlər; **~ options** köhnəlmiş baxışlar; *Electronic equipment quickly becomes obsolescent Elektron cihazlar istifadədən tez çıxır;* **2.** *biol.* yox olan *(növ)* ; məhv olan *(orqan)*

**obsolete** ['ɔbsəli:t] *adj* **1.** köhnəlmiş, köhnə, istifadədən çıxmış, dəbdə olmayan; **~ customs** köhnə adətlər / ənənələr; **completely ~** tam köhnəlmiş; *Obsolete words can be met in old texts İstifadədən çıxmış sözlərə qədim mətnlərdə təsadüf etmək olar;* **2.** lazım olmayan; nimdaş, sürtülmüş, yeyilmiş, abırdan çıxmış; **3.** ölgünləşmiş, fəaliyyətini itirmiş *(orqan);*

**obsoleteness** ['ɔbsəli:tnıs] *n* köhnəlmə, nimdaşlıq

**obstacle** ['ɔbstəkl] *n* **1.** maneə, sədd, əngəl, çətinlik; **to throw an ~ in** *smb.***'s way** bir kəsə maneə/ əngəl törətmək; **to pose ~** mane olmaq; **to remove ~s** maneələri aradan qaldırmaq; **to come across / to face / to encounter ~s** maneələrlə / çətinliklərlə üzləşmək, çətinliklərə rast gəlmək; **to clear / to overcome / to surmount ~s** maneələri / çətinlikləri aradan qaldırmaq; **to remove ~s for peace** dünya sülhü üçün maneələri / əngəlləri aradan qaldırmaq; **insurmountable / formidable ~** çətin aradan qaldırılan maneə; **artificial ~** süni maneə, uydurma problem; **natural ~s** təbii maneələr; **2.** *id.* maneə; **artificial ~** süni maneə *(at idmanında)*; **closed ~** örtülü maneə *(at idmanında)*; **~ race** maneələrlə qaçış; **to overcome ~** maneələri aşmaq / dəf etmək

**obstetric** [əb'stetrık] *adj* mamalıq, doğuma yardım edən, **~ department / unit / division / service** mamalıq / doğum şöbəsi; **~ surgeon** mama həkim, mama, mamaça

**obstetrical** [əb'stetrıkl] *adj* = **obstetric**

**obstetrician** [.ɔbste'trıʃn] *n* mama həkimi, mama, mamaça

**obstetrics** [ɔb'stetrıks] *n* mamalıq

**obstinacy** ['ɔbstınəsı] *n* **1.** inadkarlıq, inadcıllıq, tərslik, höcətlik; möhkəmlik, mətinlik; **mulish ~** qatır tərsliyi / inadkarlığı / inadcıllığı; *Mulish obstinacy prevented her from apologizing Qatır inadkarlığı ona üzr istəməyə mane oldu / imkan vermədi;* **2.** çətin sağalma / müalicə olunma *(xəstəlik haq.)*

**obstinate** ['ɔbstınıt] *adj* **1.** özbaşına, inad, inadcıl, inadkar, kəc, israrlı, səbatlı; daimi, gərgin, sabit; **~ resistance** inadlı / daimi müqavimət; **an old ~ man** qoca inadkar kişi; *The obstinate old man refused to go to hospital Qoca inadkar kişi xəstəxanaya /müalicəyə getməkdən imtina etdi;* **2.** çətin idarə olunan, qarşısı çətin alınan; **3.** çətin sağalan, müalicəsi çətin olan; **~ sleeplessness** daimi yuxusuzluq

**obstinately** ['ɔbstınıtlı] *adv* inadla, inadkarlıqla, tərsliklə, tərs-tərs, təkidlə, israrla, möhkəm; **to persist ~** inadla/israrla dediyinin üstündə dayanmaq, dediyindən dönməmək; *He obstinately refused to help O, kömək etməkdən inadla / təkidlə boyun qaçırdı*

**obstipation** [.ɔbstı'peıʃn] *n tib.* bərk / möhkəm qəbizlik

**obstreperous** [əb'strepгəs] *adj* **1.** səsli-küylü, azğın, qudurğan, coşğun; nadinc, ipə-sapa yatmayan, rahatsız; **~ children** səsli-küylü/nadinc /ipə-sapa yatmayan uşaqlar; *He becomes obstreperous when he's had a few drinks Bir az içəndə o azğınlaşır / ipə-sapa yatmır*

**obstreperously** [əb'streprəslı] *adv* səs-küylə, azğıncasına, qudurğanlıqla, bərkdən, ucadan; qudurmuşcasına

**obstruct** [əb'strʌkt] *v* **1.** mane olmaq, kəsmək *(yolu)*, əngəl törətmək / yaratmaq; *The door is now so obstructed with stones Qapının qarşısı daşlarla möhkəm bağlıdır;* **to ~ a road** yolu kəsmək; **to ~ a traffic** hərəkətə mane olmaq / əngəl törətmək / yaratmaq; *A wall obstructs the view Divar görməyə mane olur;* **to ~ a person in the discharge of his duties** bir kəsə vəzifələrini yerinə yetirməyə mane olmaq; **2.** çətinləşdirmək, qabağını tutmaq/kəsmək; pərdələmək; **to ~ the light** işığın qabağını kəsmək; **3.** *tib.* keçidi çətinləşdirmək; **4.** *id.* hərəkətə mane olmaq, qarşısını kəsmək

**obstruction** [əb'strʌkʃn] *n* **1.** maneə, əngəl, çətinlik; keçidin bağlanması; **an ~ in the road** yolda maneə; **policy of ~** maneəçilik siyasəti; *The fallen tree was an obstruction in the road Yıxılmış ağac yolda maneə / çətinlik yaratmışdı;* **2.** probka, tıxac; **~ in the pipe** boruda probka /tıxac; **3.** *tib.* keçməməzlik; tutulma; **adhesive ~** bağırsaq keçməməzliyi; **respiratory ~** nəfəsalmanın/tənəffüsün çətinləşməsi; **4.** obstruksiya *(parlament iclasını şuluqluq salmaqla qəsdən pozma)*

**obstructionism** [əb'strʌkʃənızm] *n siya.* obstruksionizm *(obstruksiya yolu ilə siyasi mübarizə üsulu: bax:* **obstruction** *4-cü mənada)*

**obstructionist** [əb'strʌkʃənıst] *n siya.* obstruksionist *(bax:* **obstruction** *4-cü mənada)*

**obstructive** [əb'strʌktıv] *adj* mane olan, əngəl törədən, qabağını alan / kəsən

**obtain** [əb'teın] *v* **1.** almaq; əldə etmək; qazanmaq; **to ~ permission / information/advice/ a reward** icazə/məlumat/məsləhət / mükafat almaq; **to ~ experience** təcrübə qazanmaq; *I climbed to obtain a general view of the surrounding scene Mən ətrafı daha yaxşı görmək üçün bir qədər yuxarı dırmandım; I managed to obtain the book I wanted Mən istədiyim kitabı əldə edə bildim; He obtained his knowledge through years of hard study O, biliyini illərlə çəkdiyi ağır zəhmət yolu ilə qazanmışdı / əldə etmişdi;* **to ~ a commission** *hərb.* zabit rütbəsi almaq; **2.** istifadə etmək / edilmək; yaşamaq, mövcud olmaq; *This custom still obtains in some districts Bu adət hələ də bir sıra əyalətlərdə yaşayır/mövcuddur;* **3.** *mal.* cəlb etmək; almaq; əldə etmək; **to ~ funds** vəsaitləri cəlb etmək; **to ~ credit** kredit almaq/ əldə etmək; **to ~ a licence** lisenziya almaq; **to ~ a permit** icazə almaq; **to ~ a result** nəticəyə nail olmaq

**obtainable** [əb'teɪnəbl] *adj*, əl çatan, əldə edilə bilən, mümkün olan, nail oluna bilən; ~ **information** əldə edilə bilən məlumat; ~ **price** imkan çatan/əlverişli qiymət
**obtrude** [əb'tru:d] *v* **1.** çıxartmaq; *The snail slowly obtruded his horns İlbiz yavaş-yavaş buynuzlarını çıxartdı;* **2. (on, upon)** zorla qəbul etdirmək / boynuna qoymaq; **to ~ *one's* opinions upon / on *smb.*** öz fikirlərini/baxışlarını başqalarına qəbul etdirmək; **to ~ oneself** boğaza keçmək, zəhlə tökmək, əl çəkməmək, özünü araya soxmaq
**obtruncate** [əb'trʌŋkeɪt] *v* kəsmək; yuxarı hissəsini kəsib atmaq, başını kəsmək
**obtrusion** [əb'tru:ʒn] *n* zorla boynuna qoyma / qəbul etdirmə; ~ **of *one's* opinions** öz fikirlərini / baxışlarını başqalarına zorla qəbul etdirmə
**obtrusive** [əb'tru:sɪv] *adj* **1.** gözəçarpan, qabağa çıxan, dik duran; **a sharp ~ edge** iti / dik duran kənar/uc; **2.** əl çəkməyən, zəhlətökən, zəhləaparan, qır-saqqız; qarayaxa
**obtrusively** [əb'tru:sɪvlɪ] *adv* əl çəkməyərək, zəhlə tökərək / aparaq, təngə gətirərək, sırtıq-sırtıq, həyasızcasına
**obtrusiveness** [əb'tru:sɪvnɪs] *n* zəhlətökənlik, zəhlə aparma, təngə gətirmə, sırtıqlıq, bezikdiricilik, usandırıcılıq, qarayaxalıq
**obtuse** [əb'tju:s] *adj* **1.** küt, korazehin, anlamaz, qanmaz, fəhmsiz, korafəhm, aciz; ~ **pain** küt ağrı; ~ **person** korazehin/anlamaz/qanmaz adam; **2.** *hənd.* kor; ~ **angle** kor bucaq; **3.** küt uclu *(yarpaq haq.)*
**obtuse-angled** [əb'tju:s'æŋgld] *adj* korbucaqlı; ~ **triangle** korbucaqlı üçbucaq
**obtusely** [əb'tju:slɪ] *adv* gic-gic, axmaqcasına, axmaq-axmaq, axmaq, əsassız, mənasız, boş, boş-boş
**obtuseness** [əb'tju:snɪs] n **1.** kütlük, korazehinlik, fəhmsizlik, korafəhmlik, acizlik; **2.** sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq, anlamazlıq, qanmazlıq, fərasətsizlik
**obtusity** [əb'tju:sɪtɪ] *n* = **obtuseness**
**obverse** ['ɔbvə:s] *n* **1.** üst/üz tərəfi *(medalın, sikkənin);* **2.** əlavə, əlavə etmə, tamamlama; tərkib hissəsi; **3.** *mən.* məntiqcə əks / zidd olan; *The obverse of love is hate Məhəbbətin əksi nifrətdir*
**obversion** [əb'və:ʃn] *n* çevrilmə, çevirmə
**obviate** ['ɔbvɪeɪt] *v* **1.** qaçınmaq, çəkinmək, kənar gəzmək, yayınmaq, özünü kənara çəkmək, boyun qaçırmaq; **to ~ danger** təhlükədən qaçmaq / kənar gəzmək **2.** aradan qaldırmaq, yox / kənar etmək; **to ~ difficulty** çətinliyi aradan qaldırmaq; **to ~ problems** problemləri aradan qaldırmaq
**obvious** ['ɔbvɪəs] *adj* **1.** aşkar, açıq, aydın, şübhəsiz, göz qabağında olan; *It was obvious that the child was ill Şübhəsiz idi ki, uşaq xəstədir;* **2.** aydın, anlaşılan, asan anlaşılan; **an ~ intention** aydın məram / niyyət / fikir
◊ **as is ~** göründüyü kimi; *Proof is obvious riy. az. İsbat aydındır*
**obviously** ['ɔbvɪəslɪ] *adv* **1.** açıq, açıqcasına, açıq-aydın, açıq-aşkar, aşkar, şübhəsiz, görünür, görünür ki, yəqin, yəqin ki, *Obviously, he has not recognized me Görünür ki, o, məni tanımadı;* **2.** yersiz, yersiz olaraq, həddən artıq açıq / aşkar
**obviousness** ['ɔbvɪəsnɪs] *n* aşkarlıq, aydınlıq, açıqlıq, şübhəsizlik
**ocarina** [,ɔkə'ri:nə] *n mus.* ney *(italyan aləti)*
**occasion¹** [ə'keɪʒn] *n* **1.** imkan, fürsət, şans; **to have an ~** imkanı olmaq; **to take an ~** imkandan istifadə etmək; **fitting / propitious ~** uyğun/əlverişli imkan; *I had no occasion to speak to them Mənim onlarla söhbət etməyə imkanım olmadı; An occasion arises İmkan yaranır;* **on numerous ~s** tez-tez; **on ~** imkan olanda, bəzən; təsadüfən; **2.** əsas, səbəb, əsaslı dəlil; *His insulting remark was the occasion of a bitter quarrel Onun təhqiramiz qeydi böyük qalmaqala səbəb oldu;* **3.** bir şeyə bais olan insan; *He will not forget those who have been the occasions of cruelty O, qəddarlığa bais olanları yaddan çıxarmayacaq;* **4.** hadisə, olay; **5.** vacib hadisə, önəmli olay; **to celebrate / to mark / to observe an ~** hadisəni qeyd etmək; **gala ~** təntənəli hadisə; **happy/joyful/joyous ~** sevindirici hadisə; **memorable ~** yadda qalan hadisə; **official ~** rəsmi hadisə; **special ~** xüsusi hadisə; **unforgettable ~** unudulmaz hadisə; **festive ~** bayram
**occasion²** [ə'keɪʒn] *v* səbəb /bais olmaq; *I saw an advertisement which occasioned me much thought Məni dərin düşündürən bir elana rast gəldim*
**occasional** [ə'keɪʒənl] *adj* **1.** vaxtaşırı, bəzən, nadir hallarda baş verən; nadir, təsadüfi; **2.** müəyyən hadisəyə həsr olunmuş *(nitq, ədəbi əsər və s.);* müəyyən məqsədlə edilmiş, müəyyən vəziyyətdən doğmuş; ~ **ode** müəyyən hadisəyə həsr olunmuş oda *(şer);* **3.** təsadüfi, xüsusi və ya köməkçi məqsədlə istifadə edilmək üçün nəzərdə tutulmuş; ~ **seat** əlavə yer *(teatrda)*
**occasionalism** [ə'keɪʒnəlɪzm] *n fəls.* okkazionalizm, təsadüf
**occasionally** [ə'keɪʒnəlɪ] *adv* bəzən, nadir hallarda, aradabir, vaxtaşırı; hərdən, hərdənbir, aradabir
**occidental¹** [,ɔksɪ'dentl] *n* **1.** qərbdə yaşayan və ya anadan olmuş adam; **2.** *arx.* qərb dövləti; **3.** əsası roman dilləri olan süni dil
**occidental²** [,ɔksɪ'dentl] *adj* qərbi, ~ **civilization /climate/habit** qərb mədəniyyəti/iqlimi/adətləri
**occidentalism** [,ɔksɪ'dentəlɪzm] *n* qərb xalqlarının adət-ənənələri/ davranış normaları/ mentaliteti və s.
**occipital** [ɔk'sɪpɪtl] *adj anat.* peysər; ~ **artery** peysər arteriyası



**occiput** ['ɔksɪpʌt] *n (pl* **occipita**) *anat.* peysər
**occlude** [ɔ'klu:d] *v* **1.** yolunu kəsmək, bağlamaq *(deşiyi, keçidi),* lehimləmək; **a thrombus occluding an artery** arteriyanın yolunu tutan tromb; **2.** bitişmək, bir-birinə dayanmaq *(dişlər haq.); His teeth do not occlude properly Onun dişləri bir-birinin üstünə düz düşmür*
**occlusion** [ɔ'klu:ʒn] *n* **1.** maneə, çəpər **2.** *kim.* okklüziya **3.** *tib.* keçməməzlik, qəbizlik; **coronary ~** beyin damarlarının keçməməzliyi; **4.** *tib.* dişlərin üst-üstə oturması; **5.** *dilç.* tam bağlanma, tamam bitişmə *(səsin yaranması zamanı)*
**occult¹** [ɔ'kʌlt] *adj* **1.** gizli, məxfi; **2.** sirli, dərk edilməz, qaranlıq; **3.** *tib.* gizli, görünməz
**occult²** [ɔ'kʌlt] *v astr.* **1.** gizləmək; **2.** qabağını kəsmək, kölgə salmaq
**occultism** ['ɔkəltɪzm] *n* okkultizm *(insanda və kainatda gizli qüvvələrin mövcudluğunu etiraf edən təlimlərin ümumi adı)*
**occultist** ['ɔkəltɪst] *n* okkultist *(insanda və kainatda gizli qüvvələrin mövcudluğunu etiraf edən təlimlərin davamçısı)*
**occupancy** ['ɔkjupənsɪ] *n* **1.** icarəyə götürmə, icarə, müvəqqəti sahiblik; icarəyə götürülən yer; **2.** icarə müddəti, istifadə müddəti; **3.** bir yerin tutulması *(sahə, ərazi);* ~ **of space** ərazinin tutulması
**occupant** ['ɔkjupənt] *n* **1.** sakin, kirayənişin; müvəqqəti sahib; icarəçi *(ev);* **2.** hər hansı bir vəzifə sahibi olan şəxs; *A sacrilegious occupant of the English throne İngilis taxt-tacına qeyri-qanuni sahiblik edən;* **3.** *hüq.* sahibi olmayan əmlaka yiyə durmuş şəxs; **4.** qəsbkar, işğalçı
**occupation** [,ɔkju'peɪʃn] *n* **1.** sənət, peşə, iş, məşğuliyyət; **agricultural ~** kənd təsərrüfatı ilə məşğul olma; **gainful ~** gəlir gətirən iş; pullu vəzifə; **unhealthy ~** səhhət üçün zərərli iş; **primary ~** əsas iş; **secondary ~** köməkçi iş; *Parachuting is a dangerous occupation Paraşüt idmanı təhlükəli işdir;* **profitable / rewarding / lucrative ~** gəlirli sənət/peşə **2.** müvəqqəti istifadə *(evdən və s.);* müvəqqəti icarə; yaşama müddəti; *During his occupation of the house and land Onun evi və torpağı icarəyə götürdüyü müddətdə;* ~ **bridge** çox istifadə edilən körpü; ~ **road** çox istifadə edilən yol; **3.** icarəyə götürülmüş torpaq sahəsi; mülkiyyət; **4.** işğal / qəsb etmə *(ərazini);* işğal müddəti *(əsasən 2-ci Dünya Müharibəsinə aid);* **5.** iş; *Harold and Swend gave him full occupation throughout the year Harold və Svend onu bir illik işlə təmin etdilər*
**occupational** [,ɔkju'peɪʃənl] *adj* peşəkar, işlə bağlı/ əlaqədar; ~ **accident** istehsalatda bədbəxt hadisə; ~ **category** peşəkar qrup; ~ **choice** peşə/sənət seçimi; ~ **classification** peşəyə / sənətə görə təsnifat; ~ **discrimination** sənət seçimi zamanı ayrıseçkilik; ~ **disease / illness** peşə xəstəliyi; ~ **dust** istehsalat tozu; ~ **exposure** peşə şüalanması; ~ **hazard** istehsalat / peşə riski; ~ **life** şəxsin ümumi iş stajı; ~ **pollution** istehsalatda ətraf mühitin çirklənməsi; ~ **safety** əməyin qorunması və texniki təhlükəsizlik; ~ **standards** texniki təhlükəsizlik qaydaları; ~ **training** peşə təlimi
**occupier** ['ɔkjupaɪəʳ] *n* **1.** sakin; **2.** icarəçi; müvəqqəti sahib; **3.** *hərb.* işğalçı, qəsbkar; **4.** ekspedisiya *(yerətrafı kosmik stansiyada)*
**occupy** ['ɔkjupaɪ] *v (pt, pp* **-ied**) **1.** icarəyə götürmək *(evi, mənzili);* tutmaq, işğal etmək, qəsb etmək; **2.** tutmaq, əhatə etmək *(sahə),* almaq *(vaxt, zaman); The garden occupies 5 acres Bağ 5 akr yeri əhatə edir; This hobby occupies all of my free time Bu əyləncə mənim bütün boş vaxtımı alır;* **3.** cəlb etmək, almaq, girmək *(beyinə, ağıla);* **4.** vəzifədə olmaq, vəzifə tutmaq
**occur** [ə'kə:ʳ] *v* **1.** baş vermək, həyata keçmək; **to ~ again** təkrarlanmaq, təkrar baş vermək; **2.** rast gəlmək, rastına / qarşısına çıxmaq, təsadüf etmək; **3.** *geol.* yerləşmək *(yataq); Marble also occurs here Burada həmçinin mərmər yataqları yerləşir;* **4.** ağıla gəlmək *(fikir, söz, ideya, hərəkət və s.); New ideas occur to him in the act of writing Yazı yazarkən onun ağlına yeni ideyalar gəlir; It did not occur to me to mention it Bunu yada salmaq mənim heç ağlıma belə gəlmədi;* **to ~ as...** ...hər hansı şəkildə rast gəlmək; **to ~ in nature** təbiətdə rast gəlmək; **to ~ native** külçə halda rast gəlmək
◊ *Black sheep occur in all families at. söz.* ≅ *Sürü axsaqsız olmaz*
**occurence** [ə'kʌrəns] *n* **1.** hadisə, əhvalat, epizod; **everyday/daily/regular/common ~** gündəlik/müntəzəm/adi baş verən hadisə; **strange /unusual ~** qəribə əhvalat; **2.** *geol.* yerləşmə, yataq *(minerallar haq.)*
**ocean¹** ['ouʃn] *n* **1.** dünya okeanı *(yer kürəsinin ümumi su ehtiyatları);* **2.**: **the Pacific Ocean** Sakit okean; **the Atlantic Ocean** Atlantik okean; **across the ~** okeanın o tayında; **in the ~** okeanda; **to fly across the ~** okeanın üstündən uçub keçmək; **near-surface ~** okeanın üst təbəqəsi/qatı; **open ~** açıq okean; **rough ~** təlatümlü okean; **2.** *(hər hansı bir şeyin külli miqdarı: yer, zaman, əşyaların sayı);* geniş sahə; *d.d.* külli miqdar; **~s of time** çoxlu vaxt; **~s of tears** çoxlu göz yaşları; **~s of money** çoxlu / külli miqdarda pul
**ocean²** ['ouʃn] *adj* okean; ~ **bed / floor** okeanın dibi; ~ **lane** okean yolu; ~ **eddy** okean burulğanı; ~ **pollution** okean çirklənməsi; ~ **water** okean suyu
**ocean-going** ['ouʃn'gouɪŋ] *adj* okean *(gəmi haq.);* ~ **ship** okean gəmisi
**Oceania** [,ouʃɪ'eɪnjə] *n* Okeaniya
**Oceanian¹** [,ouʃɪ'eɪnjən] *n* Okeaniya sakini, Sakit Okean adalarının sakini; polineziyalı

**Oceanian**[2] [ˌouʃɪ'eɪnjən] *adj* Okeaniyaya aid olan
**oceanic** [ˌouʃɪ'ænɪk] *adj* **1.** okean; ~ **fishery** okean balıqçılığı **2.** çox böyük, okean qədər iri
**oceanographic** [ˌouʃjənə'græfɪk] *adj* okeanoqrafik; ~ **research** *coğr.* okeanın öyrənilməsi; ~ **station** okeanoqrafik stansiya; ~ **winch** okeanoqrafik bucurqad
**oceanography** [ˌouʃjə'nɔgrəfɪ] *n* okeanoqrafiya; **satellite** ~ peyk okeanoqrafiyası; **synoptic** ~ sinoptik okeanoqrafiya
**oceanology** [ˌouʃjə'nɔləʤɪ] *n* okeanologiya
**ocean-wide** ['ouʃnwaɪd] *adj* okean kimi böyük, nəhəng, çox iri / böyük, azman
**ocellate** ['ousɪleɪt] *adj* gözəbənzər
**ocellus** ['ouseləs] *n* **1.** kiçik göz, gözcük; **2.** *zool.* faset gözlər *(həşəratlarda)*; **3.** *zool.* dəridə xal və ya ləkə
**ocelot** ['ousɪlɔt] *n zool.* oselot (*Cənubi Amerikada yaşayan sarı xallı dərisi olan vəhşi pişik)*
**ochlocracy** [ɔk'lɔkrəsɪ] *n fəls.* oxlokratiya (*"kütlənin" hökmranlığı)*
**ochre** ['oukəʳ] *n* **1.** oxra *(rəng növü: sarı ya qırmızı)*; **2.** solğun qəhvəyi-sarı rəng; **3.** *jarq.* pul
**octad**[1] ['ɔktəd] *n* səkkizlik heca; *komp.* səkkizbitlik bayt
**octad**[2] ['ɔktəd] *adj kim.* səkkizvalentli
**octagon** ['ɔktəgən] *n riyaz.* səkkizbucaq
**octagonal** [ɔk'tægənl] *adj riyaz.* səkkizbucaqlı
**octahedral** [ˌɔktə'hedrl] *adj* səkkizüzlü, oktaedr tipli
**octahedron** [ˌɔktə'hedrn] *n* səkkizüz, oktaedr; ~ **space** *riyaz.* oktaedrin sahəsi
**octal** ['ɔktl] *adj* = **octahedral**
**octane** ['ɔkteɪn] *n kim.* oktan; ~ **number** oktan sayı
**Octans** ['ɔktəns] *n astr.* oktant (*ulduzlar toplumu*)
**octant** ['ɔktənt] *n* **1.** dairənin səkkizdə bir hissəsi; **2.** oktant *(bucaq ölçən alət)*
**octarchy** ['ɔkta:kɪ] *n* oktarxiya *(səkkiz şəxs tərəfindən həyata keçirilən hakimiyyət; səkkiz krallığın / tayfanın birliyi)*
**octave** ['ɔktɪv] *n* **1.** *mus.* oktava; *(musiqi alətlərinin dillərinin oktava intervalına uyğun gələn ardıcıllığı)*; **2.** prosodiya, səkkiz misralı şer, oktava; **3.** *din.* bayramdan sonra səkkizinci gün; bayramdan sonrakı həftə; **4.** səkkizlik, səkkiz əşya; **5.** səkkizinci yer *(qılıncoynatmada)*; **6.** çaxır çəlləyi *(61 litr həcmində)*
**octavo** [ɔk'teɪvou] *n* səhifənin 1/8 hissəsi həcmində kitab formatı
**octennial**[1] [ɔk'tenjəl] *n* səkkizillik müddət
**octennial**[2] [ɔk'tenjəl] *adj* **1.** səkkizillik; **2.** səkkiz ildən bir təkrar olunan
**octet** [ɔk'tet] *n* **1.** *mus.* oktet **2.** sonetin ilk səkkiz sətrinin prosodikası; **3.** səkkiz nəfər tərəfindən çalınan musiqi parçası
**octivalent** [ək'tɪvlənt] *adj* səkkizvalentli
**October** [ɔk'toubə] *n* oktyabr; **in** ~ oktyabrda
**octogenarian**[1] [ˌɔktouʤɪ'neərɪən] *n* səksən yaşlı adam
**octogenarian**[2] [ˌɔktouʤɪ'neərɪən] *adj* səksən yaşlı, səksən yaşlı adama xas olan
**octonarian**[1] [ˌɔktou'neərɪən] *n* səkkizbölgülü şer
**octonarian**[2] [ˌɔktou'neərɪən] *adj* səkkizbölgülü *(şer)*
**octopus** ['ɔktəpəs] *n zool.* **1.** səkkizayaqlı dəniz heyvanı, oktapod; **2.** *məc.* canavar, qansoran, qaniçən
**octosyllabic**[1] ['ɔktousɪ'læbɪk] *n* səkkizhecalı şer
**octosyllabic**[2] ['ɔktousɪ'læbɪk] *adj* səkkizhecalı
**octosyllable**[1] ['ɔktouˌsɪləbl] *n* səkkizhecalı söz
**octosyllable**[2] ['ɔktouˌsɪləbl] *adj* = **octosyllabic**[1]
**octovalent** ['ɔktou'vælənt] *adj kim.* səkkizvalentli
**octuple** ['ɔktjupl] *adj* səkkiz dəfə/qat
**octyl** [ˌɔk'tɪl] *n kim.* oktil; ~ **phenol** oktilfenol
**ocular**[1] ['ɔkjuləʳ] *n* **1.** göz, okulyar; **2.** *zar.* göz, bəbək
**ocular**[2] ['ɔkjuləʳ] *adj* **1.** göz; okulyar; **2.** formaca gözəbənzər; **3.** əyani *(sübut və s.)*
**oculist** ['ɔkjulɪst] *n tib.* okulist; göz həkimi
**odd**[1] [ɔd] *n* **1.** tək say; **2.** qəribəlik, qəribə şey; **3.** həlledici ötürmə *(vist oyununda - kart)*; **4.** *id.* qolf oyununda üstünlük verən zərbə;
◊ **game of** ~ **man out** artıq qalan adamın oyundan çıxması qaydası ilə oynanılan oyun; ~ **and even** tək və cüt
**odd**[2] [ɔd] *adj* **1.** tək; ~ **numbers** tək rəqəmlər; *A wheel in general contains an odd number of teeth Adətən təkərdə millərin sayı tək olur;* **2.** cüt olmayan; **an** ~ **shoe** bir tay ayaqqabı; **3.** aşan; artıq olan *(məbləğdən və ya saydan)*; **thirty** ~ **years** otuz ildən artıq; *A volume of 300 odd pages 300-dən artıq səhifədən ibarət cild;* **4.** əlavə; *A few odd dollars for entertainment Əyləncə üçün verilmiş əlavə bir neçə dollar;* **5.** təsadüfi; qeyri-mütəmadi; ~ **job** təsadüfi iş; ~ **man/hand** təsadüfi iş yerinə yetirən adam; *As usual I lived by odd-jobbing for the blacks on the sugar plantations Mən, adətən zəncilərin şəkər tarlalarında tapdığım təsadüfi işlərlə dolanırdım;* **6.** qərib, yad, qeyri-adi, qəribə, ekssentrik; *It was odd of her to do that Onun belə iş görməsi qəribədir;* **7.** uzaq, ucqar; *He had to seek odd corners for his safety O öz şəxsi təhlükəsizliyi üçün ucqar rayon axtarmağa məcbur idi;*
◊ **the** ~ **man** həlledici səs *(səsvermədə)*; ~ **man out 1)** tərəfdaşsız qalmış oyunçu; **2)** *d.d.* təkliyi üstün tutan insan; soyuq, istiqanlı olmayan adam
**odd-come-short** ['ɔdkʌm'ʃɔ:t] *n* **1.** qalıq *(parçanın və s.)*; **2.** qırıntılar, qalıqlar
**odd-come-shortly** ['ɔdkʌm'ʃɔ:tlɪ] *n* yaxın gələcək; **one of these odd-come-shortlies** tezliklə, bu günlərdə, yaxın zamanlarda, yaxın günlərin birində
**oddfellow** ['ɔdˌfelou] *n* gizli qardaşlıq cəmiyyətinin üzvü *(XVIII əsrdə İngiltərədə yaranmış masson ordeninə bənzər)*



**oddish** ['ɔdɪʃ] *adj* qəribə, qeyri-adi, ekssentrik
**oddity** ['ɔddɪtɪ] *n* **1.** qəribəlik, qeyri-adilik; **2.** qeyri-adi və qəribə sayılan əşya və ya hadisə; **3.** qəribə adam, tühaf adam; **4.** kuryoz
**oddly** ['ɔdlɪ] *adv* **1.** yanbayan olmayan, qeyri-bərabər; **2.** qəribə; ~ **enough** nə qədər qəribə olsa da
**oddments** ['ɔdmənts] *n* **1.** qalıqlar; pərakəndə atılmış əşyalar; **2.** kitabın əsas mətnə aid olmayan hissəsi *(mündəricat, giriş)*
**oddness** ['ɔdnɪs] *n* **1.** qəribəlik, qeyri-adilik; **2.** təklik *(cütlüyün əksi)*
**odds** [ɔdz] *n* **1.** qeyri-bərabərlik; fərq *(vahidlər arasında)*; **to make** ~ **even** fərqləri aradan qaldırmaq; **2.** üstünlük; **considerable / formidable / great / hopeless / overwhelming** ~ hissolunacaq / əsaslı üstünlük; *The odds are in our favour Üstünlük bizim tərəfimizdədir;* **to give** ~ üstünlük imkanı vermək; **to receive** ~ üstünlük əldə etmək; **3.** imkan, naxış, şans, qabaqcadan verilmiş üstünlük; **long** ~ qeyri-bərabər imkanlar; ortaya qoyulan pulun böyük dərəcədə qeyri-bərabərliyi; **4.** fikir ayrılığı; narazılıq; **5.** qeyri-obyektivlik, qərəzlilik;
◊ **It makes no** ~ Heç bir fərqi yoxdur; Önəmli deyil; *What's the odds?* **1)** *Fərqi nədir?*; **2)** *Bunun nə mənası?*; *id. Hesab neçədir?*; ~ **and ends** qırıntılar, tör-töküntü, zir-zibil; təsadüfi əşyalar; **by long** ~ əhəmiyyətli dərəcədə; **to shout the** ~ öyünmək; **to be at** ~ təzadlı olmaq, uyğun gəlməmək; **to make** ~ **even** fərqi aradan qaldırmaq; **equal** ~ bərabər imkanlar
**ode** [oud] *n* **1.** oda *(şer)*; **2.** *din.* dini himn
**odeum** [ou'dɪəm] *n* **1.** Odeon *(Romada və Qədim Yunanıstanda kiçik örtülü teatr)*; **2.** konsert zalı, tamaşaçı zalı
**Odin** ['oudɪn] *n əsat.* Odin *(Skandinaviya əsatirlərində baş Allah)*
**odious** ['ouʤəs] *adj* mənfur, çirkin, rəzil, əclaf, alçaq, iyrənc, bədnam; ~ **lie** iyrənc yalan; ~ **smell** iyrənc / pis iy; **an** ~ **business** mənfur / çirkin iş; ~ **crime** çirkin cinayət
**odiously** ['ouʤəslɪ] *adv* çox pis / iyrənc / alçaq, alçaqcasına, rəzilcəsinə, alçaq / iyrənc bir tərzdə
**odium** ['ouʤəm] *n* **1.** nifrət; çirkinlik; antipatiya; **to bring** ~ **on, to expose to** ~ mənfi münasibət oyatmaq; nifrət oyatmaq; **2.** rüsvayçılıq, həqarət, namussuzluq; **3.** mənfurluq, biabırçılıq
**odometer** [ou'dɔmɪtəʳ] *n tex.* odometr *(məsafə ölçən cihaz)*
**odontalgia** [oudən'tælʤɪə] n *tib.* diş ağrısı
**odontalgic**[1] [oudən'tælʤɪk] n *tib.* diş ağrısına qarşı dərman
**odontalgic**[2] [oudən'tælʤɪk] adj diş ağrısına qarşı
**odontoid** [ou'dɔntɔɪd] *adj* dişşəkilli, dişəbənzər, dişvarı
**odontologist** [ɔdɔn'tɔləʤɪst] *n* odontoloq, diş həkimi
**odontology** [ɔdɔn'tɔləʤɪ] *n tib.* odontologiya *(dişlərdən və dişlərin müalicəsindən bəhs edən elm)*
**odorant** ['oudərənt] *n* qoxuyayan / ətirli / iyli / iy ifraz edən maddə *(ətriyyatda istifadə edilən xoş iyli maddə)*
**odoriferous** [ˌoudə'rɪfərəs] *adj* **1.** qoxulu, yaxşı iy verən; **2.** xoş, əziz, ləzzət verən
**odorous** ['oudərəs] adj = **odoriferous**
**odour** ['oudəʳ] *n* **1.** qoxu, iy; **to emit / to exude / to give off / to produce an** ~ qoxu / iy yaymaq; **to perceive / to recognize an** ~ qoxu / iy hiss etmək; **pleasant** ~ xoş qoxu / iy; *An odour emanates from the rose Qızıl güldən xoş iy gəlir;* **faint** ~ zərif qoxu / iy; **fetid** ~ pis qoxu / iy; **foul** ~ iyrənc, mənfur qoxu / iy; **heavy** ~ ağır qoxu / iy; **musty** ~ boğanaq / ağır qoxu / iy; **pungent** ~ kəskin / tünd qoxu; **rank** ~ çürümüş / boğucu qoxu / iy; **slight** ~ yüngül/ zərif iy; **strong** ~ kəskin / tünd iy; **2.** *məc.* xüsusi iy, xüsusi dad çaları; *(mücərrəd anlayışların xüsusiyyətləri haq.)*; **3.** cəmiyyətdə yer; şan-şöhrət; etibar; **to make** ~ **even** fərqləri aradan qaldırmaq; **to be in bad** ~ **with** *smb.*, **to be in ill** ~ **with** *smb.* bir kəslə pis münasibətdə olmaq, bir kəsin yanında etibarı olmamaq
**odourless** ['oudəlɪs] *adj* qoxusuz, iysiz; **an** ~ **liquid** iysiz / qoxusuz maye
**Odysseus** [ə'dɪsju:s] *n əsat.* Odissey *(Odisseya əsərinin baş qəhrəmanı, çar İtaki, Troyanın mühasirəsinin iştirakçısı)*
**Odyssey** ['ɔdɪsɪ] *n* **1.** Odisseya *(Odisseyin səyahətlərindən bəhs edən qədim yunan epik poeması)*; **2.** *məc.* macəralarla dolu uzun sürən səyahət
**oecumenical** [ˌi:kju'menɪkl] *adj din.* ümumdünya
**oedema** [i'di:mə] *n tib.* şiş, şişkinlik
**oedematic** [idɪ'mætɪk] *adj* şişmiş, şişkin
**oera** [ə're] *n* ere *(Danimarka, Norveç və İsveçdə xırda pul)*
**oesophagus** [i'sɔfəgəs] *n anat.* qida borusu
**oestrus** ['i:strəs] *n* **1.** *biol.* mozalan; **2.** impuls, stimul, niyyət; **3** *məc.* çılğınlıq, çılğın istək; **4.** *zool.* hövrə / kürsəyə gəlmə, cərə axıtma *(heyvanlarda)*
**of** *(tam forması)* [ɔv] ; *(reduksiya olunmuş forması)* [əv] *prep* **1.** *Azərbaycan türkcəsində əsasən yiyəlik hal şəkilçilərinə* **(-ın, -in, -un, -ün)** *müvafiq gəlir və ya tərcümə olunmur. Bu halda aşağıdakı mənaları bildirir:* **1)** *mənsubiyyət, yiyəlik, sahiblik*; **the pages** ~ **a book** kitabın səhifələri; **the advice of a teacher** müəllimin məsləhəti; **the leg** ~ **the table** stolun ayağı; **the meaning** ~ **the word** sözün mənası; **2)** *Hərəkət obyektinə işarə edir:* **a creator** ~ **a new current in art** incəsənətdə yeni istiqamətin yaradıcısı; **3)** *İcraçıya işarə edir:* **the deeds** ~ **our heroes** bizim qəhrəmanların şücaətləri; **4)** *Dad, tam, qoxuya işarə edir:* **the smell** ~ **flowers** çiçəklərin qoxusu; **the taste** ~ **the porridge** sıyığın dadı; **5)** *Şəxs və ya əşyanın digər şəxs və əşyalar arasından seçilməsinə işarə edir:* **holy** ~ **holies** müqəddəslərin müqəddəsi; **6)** *keyfiyyətə, xüsusiyyətə, yaşa*

*işarə edir:* **a man ~ his word** sözünün ağası olan adam; **a man ~ eighty** səksən yaşlı kişi; 7) **class, order, genus, species, kind, sort, manner** *və s. sözlərdən sonra növə, sinfə, tipə işarə edir: It was a sort of travelling school Bu, turizm məktəbinə bənzər bir şey idi;* 2.. *Azərbaycan türkcəsinə çıxışlıq hal şəkilçiləri* **(-dan, -dən)** *vasitəsilə tərcümə edilir və ya tərcümə edilmir. Bu halda aşağıdakı mənaları ifadə edir* 1) *Tamla onun hissəsi arasındakı münasibəti bildirir;* **some ~ the workers** fəhlələrdən bəziləri; **a pound ~ sugar** bir funt şəkər; 2) *səbəbə işarə edir:* **sick ~ inaction** hərəkətsizlikdən bezmiş; *He died of pneumonia O, sətəlcəmdən vəfat etdi; He did it of necessity O bunu zərurətdən etdi;* 3) *bir şeyin mənbəyinə işarə edir: I learned it of him Mən bunu ondan öyrəndim; He asked it of me O bunu məndən soruşdu;* 4) *mənşəyə işarə edir: He comes of a worker's family O, fəhlə ailəsindəndir;* 5) *istiqamət, məkan və məsafədə yerə işarə edir:* **south ~ Moscow** Moskvadan cənubda; 6) *bir şeydən azad olmuş, qurtarmış obyektə işarə edir:* **to cure ~ a disease/illness** xəstəlikdən sağalmaq; **to get rid ~ cold** soyuqdəymədən yaxa qurtarmaq; 7) *hər hansı qabın içindəki maddəyə işarə edir:* **a glass ~ milk** bir stəkan süd; 8) *əşyanın tərkib və strukturuna işarə edir:* **a pack ~ wolves** canavar sürüsü; **a herd ~ horses** at ilxısı; **a family ~ a dozen persons** on iki nəfərlik ailə; 9) *bir şeyin hansı materialdan düzəlmiş olduğunu göstərir;* **a dress ~ silk** ipək paltar; 3. *Azərbaycan türkcəsinə* **haqqında, haqda** *sözlərilə tərcümə olunur;* **a book ~ England** İngiltərə haqqında kitab; *He thinks of his friend O, dostu* **haqda** *fikirləşir;* 4. *Azərbaycan türkcəsinə tərcümə olunmur və aşağıdakı mənaları bildirir:* 1) *keyfiyyətin, xüsusiyyətin yayılma sahəsinə işarə edir:* **to be hard ~ hearing** ağır eşitmək; 2) *zamana işarə edir:* **~ an evening** axşam vaxtı; 3) *kəmiyyətə işarə edir:* **a farm ~ 100 acres** 100 akrlıq təsərrüfat sahəsi; 4) *Şübhəyə, ittihama işarə edir:* **to suspect ~ theft** oğurluqda şübhəli sayılmaq; 5) *əlavə ilə işlənir və Azərbaycan türkcəsinə tərcümə olunmur:* **the city ~ New-York** Nyu-York şəhəri; **by the name ~ John** Con adlı; 6) *sabit söz birləşmələrində işlənir, özündən əvvəl təyinedici isim tələb edir və Azərbaycan türkcəsinə tərcümə edilmir:* **a fool ~ a man** səfeh adam; **the devil ~ a worker** «əjdaha» fəhlə / işçi

**off**[1] [ɔf] *n* 1. *d.d.* boş vaxt; 2. *id.* meydançanın boulerdən sol tərəfdə yerləşən bir hissəsi *(kriket oyununda);* 3. dənizin sahildən üfüqə qədər görünən hissəsi; 4. cıdırın başlanğıcı; 5. *d.d.* cıdırın başlanması haqda siqnal; başlanğıc, yola düşmə

**off**[2] [ɔf] *adj* 1. uzaq, uzaqda yerləşən, ucqar; **an ~ district** ucqar rayon; 2. sağ, arxa; **~ side** sağ tərəf; 3. *dan.* gəminin açıq dənizə olan bortu; 4. *id.* oyundan kənar vəziyyət; 5. qarşısında müəyyən şərtlər qoyulmuş; müəyyən çərçivəyə salınmış; 6. asudə, azad; **a day ~** istirahət günü; 7. ikinci dərəcəli, vacib olmayan; **the ~ street** dalan; 8. az güman edilən; xəyali, zəif *(imkan, ümid və s.); He had an off chance to enter the university Onun universitetə daxil olması üçün cüzi şansı var idi;* **on the ~ chance** *d.d.* hər ehtimala qarşı; 9. aşağı keyfiyyətli, ikinci növ; təzə olmayan; *The meat is a bit off Ət o qədər də təzə deyil;* 10. tam sağlam olmayan, özünü pis hiss edən; *I am feeling quite off today Bu gün özümü çox pis hiss edirəm;* 11. barsız, qeyri-məhsuldar *(il);* **~ season** durğunluq dövrü *(ticarətdə və s.)*

**off**[3] [ɔf] *v* 1. *d.d.* kəsmək *(danışıqları və s.);* geri durmaq, çəkilmək; **to ~ it** *d.d.* aradan çıxmaq, əkilmək; 2. *amer.* öldürmək; başını əkmək; 3. getmək, yola düşmək, tərk etmək

**off**[4] [ɔf] *adv* 1. *bir şeydən uzaq olmağa, uzaqlaşmağa işarə edir: He had to be off O getməli idi;* **to march ~** çıxıb getmək; 2. kənarda, aralıda; *məsafə və uzaqlığa işarə edir: He stood ten paces off O, on metr aralıda dayanmışdı;* 3. *Əlaqənin və ya dayağın itirilməsinə, bir şeylə təmasın olmamasına işarə edir: The sweet rolled to the edge of the table and off Konfet masanın qırağına dığarlandı və yerə düşdü; Take off your hat! Papağını/Papağınızı çıxart /çıxardın!;* 4. *bir şeyin kəsilməsinə, ara verməsinə, dayanmasına, ləğv edilməsinə işarə edir:* **to break ~ the meeting** görüşü / iclası dayandırmaq; *The light is off İşıq sönüb;* 5. *Hərəkətin tam dayandırılmasının mənaca gücləndirilməsi üçün istifadə edilir:* **to drink ~** içmək *(axıra kimi);* **to finish ~** qurtarmaq *(tamamilə);* 6. *nəyinsə olmamasına / tükənməsinə işarə edir: The dish is off Yemək artıq qurtarıb;* **the time ~** boş vaxt *(iş olmayan vaxt)*

**off**[5] [ɔf] *inter* Rədd ol!, Dəf ol!, Cəhənnəm ol!; *Off, or I'll shoot Rədd ol/ olun, yoxsa atəş açacağam*

**off**[6] [ɔf] *prep Azərbaycan türkcəsinə çıxışlıq hal şəkilçiləri* **(-dan; -dən)** *vasitəsilə tərcümə edilir və ya tərcümə olunmur. Bu halda aşağıdakı mənaları ifadə edir:* 1) *obyektdən, istiqamətdən uzaqlaşmağa və ya obyektin hər hansı hissəsinin ayrılmasına işarə edir: Take it off the table! Bunu masanın üstündən götür/götürün!;* **a path ~ the main walk** əsas/baş yolun yanındakı cığır, əlavə yol; 2) *dan. sahildən dənizə tərəf hərəkət etməyə işarə edir:* **three miles ~ shore** sahildən üç mil aralı *(dənizə);* 3) *hərəkətin obyektinə işarə edir: I borrowed ten francs off him Mən ondan 10 frank borc aldım;* 4) *normadan, adi vəziyyətdən kənara çıxmağa işarə edir:* **~ the point** məqsəddən uzaq; işə dəxli olmayan; yerinə düşməyən, yersiz; **~ the mark** boşa çıxan *(atəş haq.);* işə aid olmayan; 5) *Hər hansı hərəkətin və ya fəaliyyətin qulaqardına verilməsinə/vurulmasına işarə edir:* **~ duty** vəzifənin yerinə yetirilməməsi;

◊ **~ the cuff** hazırlıqsız, bədahətən

**offal**[1] [ˈɔfl] *n* 1. içalat; **beef / sheep ~** mal / qoyun içalatı; 2. zibil, tullantı; 3. ucuz balıq; xırda balıq *(böyük balıqlarla birgə tora düşən);* 4. tullantılar, qalıqlar, çirkablar *(istehsalatda);* 5. *məc.* səfil, nəsibsiz, məzlum

**offal**[2] [ˈɔfl] *adj* 1.aşağı keyfiyyətli; **~ milk / wheat** aşağı keyfiyyətli süd / buğda; 2. tullantı üçün, tullantı; **~ bin** zibil vedrəsi /qabı / bunkeri

**off and on** [ˈɔfəndˈɔn] *adv* hərdənbir, gahdanbir, bəzən; *I slept off and on all the way Mən bütün yolu gah yatdım, gah oyandım*

**off-balance**[1] [ˈɔfˈbæləns] *n id.* müvazinəti itirmə *(gimnastikada)*

**off-balance**[2] [ˈɔfˈbæləns] *adj* xasiyyətcə müvazinətsiz, özünü saxlaya bilməyən

**offbeat** [ˈɔfbi:t] *adj* çox qəribə, qeyri-adi, adət edilməmiş

**offcast**[1] [ˈɔfka:st] *n* 1. səfil, atılmış; 2. tullanmış əşya, tullantı

**offcast**[2] [ˈɔfka:st] *adj* rədd edilmiş, səfil, məzlum, atılmış; **~ words** qəbul edilməz sözlər

**offence** [əˈfens] *n* 1. təhqir; acılama, könlünə toxunma, inciklik, küsü; *She takes offence at every remark O hər iraddan inciyir; O hər şeyi ürəyinə salır;* **to cause ~, to give ~ (to)** təhqir etmək, küsdürmək, incitmək; **to take ~ at** incimək *(nədənsə); Without offence... Xətrinizə dəyməsin ..., Lətifəsi sizdən uzaq;* 2. qanuna zidd hərəkət; cinayət; **to commit an ~** qanuna zidd hərəkət etmək; **impeachable ~** qanunla təqib edilə biləcək qanun pozuntusu; **indictable ~** günahlandırma aktı ilə təqib edilən cinayət; **minor / petty ~** xırda qanun pozuntusu; **serious / capital ~** ciddi cinayət; 3. *hərb.* təcavüz; hücum; 4. *din.* manea; əngəl, çətinlik. 5. *id.* hücum, həmlə

**offend** [əˈfend] *v* 1. günah işlətmək; pozmaq; 2. incitmək, təhqir etmək; toxunmaq *(qəlbə);* qıcıqlandırmaq; 3. *hüq.* cinayət etmək

**offender** [əˈfendəʳ] *n* 1. təhqir edən/adamincidən şəxs; 2. cinayətkar; **chronic ~** qatı cinayətkar; **first ~** ilk dəfə cinayət etmiş şəxs; **incorrigible ~** islah olunmaz cinayətkar; **youthful ~** cavan / yeniyetmə cinayətkar; **juvenile ~** həddi-büluğa çatmamış cinayətkar; **alleged ~** güman edilən cinayətkar; göz altına alınmış / şübhəli şəxs; **assisting / joint ~** cinayət iştirakçısı; **blue-collar ~** fəhlə sinfindən çıxmış cinayətkar; **dangerous special ~** xüsusi təhlükəli cinayətkar; **drunken ~** sərxoş halda cinayət törətmiş şəxs; **hardened ~** qatı cinayətkar; **property ~** əmlak cinayəti törətmiş şəxs; **tractable ~** asan tərbiyə edilən cinayətkar; **violent ~** zorakılıqla cinayət törətmiş şəxs.

**offensive**[1] [əˈfensiv] *n* 1. hücum, həmlə, hücum əməliyyatı; **to act on the ~, to take the ~** hücuma keçmək, hücum etmək; 2. *məc.* təcavüz, hücum mövqeyi tutma

**offensive**[2] [əˈfensiv] *adj* 1. təhqiramiz, incidici; *His actions were offensive to everyone Onun hərəkətləri hamı üçün təhqiramiz idi;* 2. iyrənc, üfunətli, xoşagəlməz, mənfur; **~ odour of garbage** zibilin üfunətli qoxusu; 3. təcavüzkar, hücum edən; **~ defensive** *hərb.* aktiv müdafiə; **~ return** əks hücuma keçmə; **~ stroke** düşmənə zərbə; **~ war** təcavüzkar müharibə; 4. hücum məqsədləri üçün nəzərdə tutulmuş; **~ weapons** hücum silahları

**offer**[1] [ˈɔfəʳ] *n* 1. təklif; **to make an ~** təklif etmək; **to accept an ~** təklifi qəbul etmək; **to agree to an ~** təkliflə razılaşmaq; **to consider an ~** təklifi nəzərdən keçirmək; **to decline / to refuse / to reject / to spurn an ~** təklifi rədd etmək; **binding ~** ciddi təklif; **firm ~** qəti təklif; **introductory ~** ilkin təklif; **contract ~** saziş təklifi; **confirmation of an ~** təklifin təsdiqi; **attractive ~** cəzbedici təklif; **advantageous ~** əlverişli təklif; **~ for sale** satışa çıxarma, satış üçün təklif etmə; **to cancel an ~** təklifi ləğv etmək; **to revoke an ~** təklifdən imtina etmək; **reasonable ~** ağıllı təklif; **tempting ~** cəlbedici/şirnikdirici təklif; **tentative / trial ~** sınaq təklifi; *Her offer to help was accepted gratefully Onun kömək etmək təklifi minnətdarlıqla qəbul edildi;* 2. *iqt.* ofert *(müqavilə, saziş təklifi);* **~ for wheat** taxıl satma təklifi; 3. qiymət təklif etmə; 4. cəhd

**offer**[2] [ˈɔfəʳ] *v* 1. təklif etmək; söz vermək; **to ~ a free pardon** tam əfvetmə sözü vermək; **to ~ a hand** əl tutmaq, kömək təklif etmək; evlənmək barədə təklif etmək; *They offered us many solutions to the problem Onlar bizə bu problemin bir sıra həlli yollarını təklif etdilər;* 2. cəhd etmək; cəlışmaq; **to ~ resistance** müqavimət göstərmək; 3. hazırlığı bildirmək; *He offered to help me O mənə kömək etməyə hazır olduğunu dedi/bildirdi;* 4. *mal.* müəyyən qiymətə satmağı təklif etmək; müəyyən qiymət təklif etmək; **to ~ compensation** kompensasiya təklif etmək; **to ~ for sale** satışa çıxarmaq; **to ~ guarantee** təminat təklif etmək; **to ~ up** fəda etmək; **to ~ up a sacrifice** qurban vermək; **when occasion ~s** imkan olanda

**offering** [ˈɔfərɪŋ] *n* 1. təklif; **to make an ~** təklif irəli sürmək, təklif vermək / etmək; **the ~ of a loan** borc təklif etmə; **primary ~** ilkin təklif; **public ~** aşkar təklif *(səhmlərin):* yeni səhmlərin rəsmi buraxılışı; 2. qurban, qurban kəsmə

**offertory** [ˈɔfətrɪ] *n* kilsəyə verilən nəzir; kilsədə duaetmə zamanı yığılan pul; nəzir yığılması zamanı oxunan ilahi mahnılar

**offhand**[1] *(həm də* **off-hand)** [ˈɔfˈhænd] *adj* 1. hazırlıqsız, ekspromt şəkildə edilmiş; 2. çəkinmədən, təklifsiz, nəzakətsiz

**offhand**[2] ['ɔf 'hænd] *adv* **1.** o dəqiqə, bir an içində, dərhal; **2.** çəkinmədən, əbədsizcəsinə, utanmadan

**offhandedly** ['ɔf 'hændıdlı] *adv* etinasızlıqla, saymazyana; başdansovma

**office**[1] ['ɔfıs] *n* **1.** vəzifə; xidmət yeri; **to assume an ~** vəzifəyə başlamaq; **to be in ~** vəzifədə/ hakimiyyətdə olmaq; **to come into ~** işləri qəbul etmək; vəzifəni yerinə yetirməyə başlamaq; **to hold ~** vəzifə tutmaq; **an ~ under Government** dövlət vəzifəsi tutma; **to win ~** seçkidə qalib gəlmək; hakimiyyətə gəlmək; **honorary ~** şərəfli vəzifə; **appointive ~** təyinatlı vəzifə; **elective ~** seçkili vəzifə; **high ~** yüksək vəzifə; **2.** borc; vəzifə; funksiya; *It is my office to open the mail Mənim vəzifəm poçtu açmaqdır;* **3.** idarə, dəftərxana, ofis; **to be in the ~** idarədə / dəftərxanada işləmək; iş yerində olmaq; **at/in an ~** ofisdə, idarədə; *She works at our office O bizim ofisdə işləyir;* **publishing ~** nəşriyyat; **editorial ~** redaksiya; **branch ~** filial; **head ~** əsas ofis, baş idarə; **booking ~** bilet kassası; **private ~** şəxsi kabinet / iş otağı; **doctor's ~** həkim kabineti; **lawyer's ~** vəkilin qəbul otağı; **left-luggage ~** mühafizə/saxlama kamerası *(vağzalda);* **lost-and-found ~** tapıntılar bürosu; **met ~** meteoroloji stansiya; **patent ~** patent bürosu; **post ~** poçt; **printing ~** mətbəə; **dentist's ~** diş həkiminin kabineti; **recruiting ~** çağırış məntəqəsi; **inquiry ~** arayış bürosu; **~ block** inzibati bina; müxtəlif firmaların ofisləri yerləşən bina; **public ~** dövlət, bələdiyyə və ya ictimai idarə; **4.** təsisat, nazirlik; **Foreign Office** Xarici İşlər Nazirliyi *(Britaniyada);* **Home Office** Daxili İşlər Nazirliyi *(Britaniyada);* **Office of Education** Federal Maarif İdarəsi *(ABŞ-da);* **5.** kabinet, otaq; təyyarəçinin kabinəsi; **6.** kömək, yardım; **good ~s** xeyirxah yardımlar; aradüzəltmə; **7.** nüfuz; himayə; **8.** xidmətlər *(kommunal - anbar, qaraj və s.);* **9.** ayaq yolu; **10.** kilsə ibadəti; mərasim, ayin; **Office for the Dead** mərhumun anılması mərasimi; **Office of the Mass** sübh və ya günorta ibadəti; **last ~s** torpağa tapşırma, dəfn mərasimi; **to say** *one's* **~** səhər / axşam duası oxumaq; **11.** *d.d.* işarə, him-cim; **to give the ~** işarə / him-cim etmək; **to take the ~** işarəni /him-cimi başa düşmək

**office**[2] ['ɔfıs] *adj* inzibati; idarə; **~ building** inzibati bina; **~ expenses** idarə xərcləri; idarə ləvazimatlarına çəkilən xərc; **~ furniture** ofis / idarə mebeli, idarə / ofis avadanlığı / ləvazimatı; **~ staff** idarə / ofis işçi heyəti; **~ boy / girl** idarədə / ofisdə xırda-para işləri görən oğlan / qız; katib / katibə; **~ hours 1)** iş vaxtı; *His office hours are from 10 a.m. to 16 p.m. Onun iş saatı 10-dan 16-ya kimidir;* **2)** qəbul saatları

**office-bearer** ['ɔfıs.bɛərʳ] *n* məmur, vəzifəli şəxs, dövlət məmuru

**office-boy** ['ɔfısbɔı] *n* məktub daşıyan oğlan, kuryer

**office-copy** ['ɔfıs.kɔpı] *n* sənədin təsdiq edilmiş nüsxəsi

**officer**[1] ['ɔfısəʳ] *n* **1.** məmur, məsul şəxs; qulluqçu; rəhbərliyin üzvü; **public ~** vəzifəli şəxs; dövlət məmuru; **public-relations ~** səfirliyin mətbuat attaşesi; məlumat şöbəsinin əməkdaşı və ya qulluqçusu; reklam agenti; **revenue ~** gömrük müfəttişi; **~ of the court** məhkəmə icraçısı və ya məhkəmə pristavı; **2.** zabit; zabitlər, zabit heyəti; **to break / to demote / to dismiss an ~** zabitin rütbəsini aşağı salmaq, zabiti vəzifədən azad etmək; **to commission an ~** zabit vəzifəsini həvalə etmək; **to promote an ~** zabitin rütbəsini artırmaq/qaldırmaq; **air-force ~** hərbi hava qüvvələrinin zabiti; **army ~** hərbi zabit; **commanding ~** komandir; rəis; hərbi başçı; sərkərdə; **duty ~** növbətçi zabit; **flag ~** admiral, kommandor; **general ~** general; **intelligence ~** kəşfiyyat zabiti; kəşfiyyat şöbəsinin rəisi; **high-ranking ~** yüksək rütbəli zabit; **liaison ~** rabitə zabiti; **line ~** nizami zabit; **medical ~** tibb xidməti zabiti; **non-commissioned ~** çavuş; unterzabit; **peace / police ~** polis işçisi, asayiş keşikçisi, polis; **senior ~** yüksək rütbəli zabit; **staff ~** qərargah zabiti; **3.** *dən.* ticarət gəmisinin kapitanı; **first ~** əsas köməkçi, **warrant ~** miçman

**officer**[2] ['ɔfısəʳ] *v hərb.* **1.** zabit heyəti ilə təmin etmək; *The regiment was well officered Alay zabit heyəti ilə yaxşı təmin edilmişdi / olunmuşdu;* **2.** zabit heyətinin komandanlıq funksiyalarını yerinə yetirmək; **3.** komandanlıq etmək, əmr vermək; müşayiət etmək; *Kate was accompanied by Miss Knag, and officered by Madame Mantalini. (Ch. Dickens) Keyti xanımı Kneq müşayiət edirdi, aparıcı rolu isə xanım Mantalini yerinə yetirirdi*

**official**[1] [ə'fıʃl] *n* rəsmi şəxs; məmur *(nüfuzlu);* qulluqçu *(dövlət işində, bankda və s.);* **appointed ~** təyin edilmiş şəxs; **customs ~** gömrük məmuru; **elected ~** seçilmiş məmur; **federal ~** federal məmur; **government / state ~** dövlət məmuru; **high ~, high-ranking ~, top-ranking ~** yüksək rütbəli məmur; **law-enforcement ~, police ~** polis məmuru; **local ~** yerli məmur; **postal ~** poçt məmuru; **responsible ~** məsul şəxs / məmur

**official**[2] [ə'fıʃl] *adj* **1.** vəzifə; vəzifə borcunun yerinə yetirilməsi ilə bağlı; **~ duties** vəzifə borcu; **2.** rəsmi; **~ statement** rəsmi bəyanat; **3.** ciddi; rəsmi *(dil, üslub);* **an ~ language** rəsmi dil; rəsmi nəsr dili; **4.** dövlətə məxsus; rəsmi; **~ circumlocution** bürokratik süründürməçilik; **5.** tibbdə və əczaçılıqda qəbul edilmiş

**officialdom** [ə'fıʃldəm] *n* **1.** *top. i* məmurlar; məmur-luq; **2.** bürokratizm, bürokratik idarəetmə üslubu / üsulu



**officialese** [ə.fıʃə'li:z] *n* **1.** dəftərxana üslubu, bürok-ratik üslub; **2.** *jarq.* məmurların və bürokratların danışıq dili; **3.** ştamp, klişe

**officialism** [ə'fıʃəli:zm] *n* **1.** bürokratizm **2.** məmur təkəbbürü; **3.** *top.i* məmurlar

**officialize** [ə'fıʃəlaız] *v* **1.** rəsmi formaya salmaq; bir şeyi rəsmilik səviyyəsinə qaldırmaq; **2.** bürokratik aparat tərəfindən idarə olunmaq

**officially** [ə'fıʃəlı] *adv* **1.** rəsmi, rəsmi olaraq; formal; **2.** bürokratik tərzdə

**officials** [ə'fıʃəlz] *n* **1.** *top. i* rəhbərlər; məmurlar; rəsmilər; **2.** iqtidar; **municipal ~** bələdiyyə rəhbərliyi; **officials' fee** məmurların maaşı

**officiant** [ə'fıʃıənt] *n* ibadəti yerinə yetirən keşiş

**officiary** [ə'fıʃıərı] *adj* **1.** vəzifə ilə əlaqədar təltif edilmiş *(rütbə haq.);* **2.** vəzifə, xidməti

**officiate** [ə'fıʃıeıt] *v* **1.** rəsmi olaraq bir işi yerinə yetirmək; **2.** ibadət etmək; **3.** təşkil etmək; **to ~ at a wedding** toy mərasimini təşkil etmək, toy mərasiminə rəhbərlik etmək

**officinal** [.ɔfı'saınl] *adj* **1.** dərman xassəsinə malik *(bitki haq.);* **2.** tibbdə / əczaçılıqda qəbul edilmiş; **3.** lüzumsuz yerə yardım etmək istəyən

**officious** [ə'fıʃəs] *adj* **1.** canfəşan, canfəşanlıq edən; *He glanced suspiciously at the officious stranger O həddindən artıq canfəşanlıq edən yad adama şübhə ilə baxırdı;* **2.** usandıran, zəhlətökən, qır-saqqız; özgənin işinə burnunu soxan; **3.** qeyri-rəsmi; rəsmiliyə riayət etməyən; **4.** *arx.* dost, yoldaş; **~ intermeddler** bir kəsin işinə qarışan/müdaxilə edən şəxs

**offing** ['ɔfıŋ] *n* **1.** sahildən üfüqə qədər görünən dəniz; **2.** *məc.* yaxın gələcək;

◊ **in the ~** yaxın gələcəkdə; **to gain / to get an ~** imkan qazanmaq / əldə etmək

**offish** ['ɔfıʃ] *adj* **1.** *d.d.* soyuq; rəsmiyyətpərəst; **2.** gizlin, ünsiyyəti sevməyən, adamdanqaçan, təkliksevən, guşənişin

**offlap** ['ɔflæp] *n geol.* sürüşmə

**offload** ['ɔf'loud] *v* artıq/arzuolunmaz əşyalardan azad olmaq

**offreckoning** ['ɔf.reknıŋ] *n mal.* çıxılma, tutulma

**offscourings** ['ɔf 'skaurıŋ] *n* **1.** təmizləmə; **2.** *məc.* əclaflar, cəmiyyətin tullantıları

**offscreen** ['ɔf'skri:n] *adj* **1.** kadrarxası; *məc.* pərdəarxası, gizli, məxfi; **2.** ekrandan kənar; şəxsi həyatda olan; **3.** kinoya çəkilməyən; televiziyada işləməyən *(aktyor haq.)*

**offset**[1] ['ɔfset] *n* **1.** yolun əvvəli; yoladüşmə; **2.** cavan budaq; yandan bitən budaq *(bitkilərdə);* **3.** budaqlanma, ayrılma *(boruda)* **4.** yamac; **5.** övlad; varis; **6.** mükafat, kompensasiya; *Defendant may plead an offset of any sum due to him by the plaintiff İddiaçı cavabdehdən onun borclu olduğu istənilən məbləği tələb edə bilər;* **7.** kontrast; bir şeyin əksi; **8.** *poliqr.* ofset *(çap üsulu)*

**offset**[2] ['ɔfset] *adj* **1.** sürüşmüş, əyilmiş, əyilən; **2.** *poliqr.* ofset; **~ printing** ofset üsulu ilə çap

**offset**[3] ['ɔfset] *v* **1.** ödəmək, kompensasiya etmək; **2.** budaqlanmaq; bir şeydən kənara çıxmaq; **3.** *poliqr.* ofset üsulu ilə çap etmək;

◊ **to ~ the illegalities** qeyri-qanuni hərəkətlərə müqavimət göstərmək; qanunsuz işləri iflic etmək / heçə çıxarmaq

**offshore**[1] ['ɔf 'ʃɔ:ʳ] *adj* **1.** sahildən aralı yerləşən; sahildən dənizə hərəkət edən; **~ wind** sahildən əsən külək; **~ islands** qitəyə yaxın yerləşən adalar; **2.** *iqt.* ofşor *(digər ölkələrdə fəaliyyət göstərən);* **~ company** ofşor şirkəti; **~ purchases** xaricdən alınmış hərbi texnika

**offshore**[2] ['ɔf'ʃɔ:ʳ] *adv* **1.** sahildən; *The wind is blowing offshore Külək sahildən əsir;* **2.** digər ölkələrdə həyata keçirilən

**offspring** ['ɔfsprıŋ] *n* **1.** övlad, törəmə; *Their offsprings are all very clever Onların övladlarının hamısı çox ağıllıdır;* **2.** məhsul, nəticə

**offspur** ['ɔfspə:ʳ] *n* yeniyetmə

**offstage** ['ɔfsteıdʒ] *adj* pərdə arxası; gizli, məxfi

**offtake** ['ɔfteık] *n* **1.** malın satışı; **2.** satılmış malın miqdarı; **3.** götürülmüş mal; **4.** məhsulun buraxılışı; **5.** baca; sobanın tüstü aparan bacası

**offtime** ['ɔftaım] *n* söndürülmə vaxtı, söndürülmüş vəziyyətdə olan vaxt; boş vaxt

**often** ['ɔfn] *adv* tez-tez, dəfələrlə; **~ and ~** kifayət qədər tez-tez; **as ~ as** hər dəfə; **more ~ than not** çox tez-tez, demək olar ki, həmişə; **as ~ as not** çox tez-tez; **once too ~** həddindən artıq tez-tez; **infinitely ~** *riyaz.* sonsuz dəfə

**oftentimes** ['ɔfntaımz] *adv* tez-tez, təkrarən; dəfələrlə

**ogival** [ə'dʒaıvl] *adj tex.* oxvari

**ogive** ['oudʒaıv] *n mem.* qübbənin oxu; oxvari qübbə

**ogle**[1] ['ougl] *n* **1.** göz; **2.** vurğun / işvəli baxış

**ogle**[2] ['ougl] *v* vurğun-vurğun / işvəli-işvəli baxmaq; aşiqanə süzmək

**ogre** ['ougəʳ] *n* **1.** adamyeyən, div *(nağıllarda);* **2.** qorxunc adam

**ogling** ['ouglıŋ] *n* **1.** vurğunluq/məftunluq ifadə edən baxış; **2.** vurğunluq / məftunluq/hərislik ifadə edən baxışla bir-birinə baxma

**ogress** ['ougrıs] *n* nəhəng adamyeyən qadın *(nağıllarda)*

**oh** [ou] *inter Oh dear! Ay Allah!. Allahım!*

**ohm** ['oum] *n tex.* om *(müqavimət vahidi);* **acoustic ~** akustik om; akom; **international ~** beynəlxalq om; **thermal ~** istilik omu; **Ohm's law** Om qanunu

**ohmage** ['oumıdʒ] *n fiz.* omla ölçülən müqavimət

**ohmic** ['oumık] *adj* **1.** om; **~ resistance** om müqaviməti; **~ contact** om qapanması; **2.** *tex* sabitləşməyən; **3.** *tex.* xətti qapanma; sabitləşməyən qapanma; sabitləşməyən om qapanması

**ohmmeter** ['ou'mi:tə] *n tex.* ommetr *(cihaz)*

**oho** [ou'hou] *int.* oho! *(təəccüb, kinayə, təntənə və s. ifadə edən nida) Aha! Anladım!*

**oik** [ɔɪk] *n d.d.* xuliqan

**oil**[1] [ɔɪl] *n* **1.** *kim.* yağ *(adətən mineral)*; **volatile / essential ~s** efir *(uçan)* yağları; **fixed / fatty ~s** uçmayan yağlar; **mineral ~s** neft məhsulları; **blasting ~** nitroqliserin **~-cloth** müşəmbə; linoleum; **2.** yağ *(bitki, sürtkü, kosmetik və s.)*; **vegetable ~** bitki yağı; **corn ~** qarğıdalı yağı; **cottonseed ~** pambıq yağı; **peanut ~** araxis yağı; **sunflower ~** günəbaxan yağı; **~ of almonds** badam yağı; **~ of dill** şüyüd yağı; **~ of eucalyptus** evkalipt yağı; **cooking ~** yemək qızartmıq üçün yağ; **salad ~** salata qatmaq üçün yağ; **refined ~** təmizlənmiş yağ *(bitki)*; **castor ~** kastor yağı; **coconut ~** kokos yağı; **cod-liver ~** balıq yağı; **whale-~** balina yağı; **olive ~, ~ d'olive** zeytun yağı; **poppy** *(seed)* **~** xaş-xaş yağı; **~ of turpentine** skipidar yağı, təmizlənmiş skipidar; **cosmetic ~** kosmetik yağ; **~ -de-rose** qızılgül yağı; **3.** neft; **to drill for ~** neft axtarışları üçün kəşfiyyat qazma işləri aparmaq; **to hit/to strike ~** neft tapmaq, qazma nəticəsində neft yatağına çatmaq; **to refine ~** nefti təmizləmək; **coal ~** bitumlu kömürdən alınmış xam neft; **crude ~** xam, təmizlənməmiş neft; **mineral ~** neft, neft məhsulu; **refined ~** təmizlənmiş, açıq rəngli neft məhsulu; **shale ~** yanacaq kimi istifadə edilən şist, bitumlu şist; **fuel ~** yanacaq; **4.** texniki yağ, sürtkü materialı; **lubricating ~** sürtkü yağı; **machine ~** maşın yağı; **motor ~** motor yağı; *Could you please check my oil too? Zəhmət olmasa, maşınımın yağına da bax/ baxın*; **5.** yağlı boya; **to paint in ~ (s)** yağlı boya ilə rəsm çəkmək; **a still-life painted in ~(s)** yağlı boya ilə çəkilmiş natürmort; **6.** yağlı boya ilə çəkilmiş rəsm; *I rather liked his oils than his drawings Mənə onun yağlı boya ilə çəkilmiş şəkilləri adi boya ilə çəkilənlərdən daha xoş gəlirdi*; **7.** *d.d.* pul; **~ of palm** rüşvət; **8.** *d.d.* müşəmbə materialından düzəldilmiş su keçirməyən geyim; balıqçı plaşı; **9.** məlumat, informasiya, fakt, həqiqət; **dinkum ~** əsl həqiqət;
◊ **to pour ~ on troubled waters** məsələni sülh yolu ilə həll etmək/yoluna qoymaq; **to pour ~ on flames** ocağa yağ tökmək, daha da qızışdırmaq, fitva vermək; **~ and vinegar** bir-birinin tam əksi; bir-biri ilə heç uyuşmayan şeylər; **~ of baston, ~ of birch, ~ of hazel, ~ of holly, ~ of whip, hickory ~, stirrup ~, strap ~** şallaqlama, qamçılama, zopalama; **to burn the midnight ~** *(lamp)* gecə yarısına qədər işləmək və ya dərs oxumaq; **to strike ~** birdən-birə çox varlanmaq; **~ of angels** kiməsə rüşvət kimi verilən qızıl / pul; **~ of barley, ~ of malt** viski; **~ of fool** tərif; çərənnəmə

**oil**[2] [ɔɪl] *adj* neft, yağ; **~ king** neft maqnatı; **~ film** yağ təbəqəsi *(mayenin üzərində)*; **~ engine** neft mühərriki; **~ industry** neft sənayesi; **~ slick** neft ləkəsi *(suda)*

**oil**[3] [ɔɪl] *v* **1.** yağlamaq, hopturmaq, üstünə yağ çəkmək/sürtmək; **to the ~ lock** qıfılı yağlamaq; **to ~ the wheels** təkərləri yağlamaq; **2.** rüşvət vermək, satın almaq; **to ~ the wheels** *məc.* işi asanlıqla həll etmək *(rüşvət vermək-lə)*; **to ~ smb.'s hand/fist/ palm** rüşvət vermək; **3.** tərifləmək; **4.** əritmək; ərimək; **5.** *məc.* sakit yerimək, kölgə kimi hərəkət etmək; *As man to man, do you want to oil out of this thing? Kişi kimi söylə/söyləyin, bu işi yoluna qoymaq istəyirsənmi/istəyirsinizmi?; I oiled round to where Jeeves awaited me Mən sakitcə Civsin məni gözlədiyi yerə yaxınlaşdım*; **to ~ up** çirkləndirmək, zibilləmək, gözünü tutmaq *(borunun)*

**oil-bearing** [ˈɔɪl.bɛərɪŋ] *adj* tərkibində neft olan; **~ formation** neft yatağı

**oilcake** [ˈɔɪlkeɪk] *n* jmıx; **~ meal** jmıx unu

**oil-car** [ˈɔɪlka:ʳ] *n d.y.* bak, sistern, çən

**oilcloth** [ˈɔɪlkləθ] *n* müşəmbə; linoleum

**oil-coat** [ˈɔɪlkout] *n* yağışdan qoruyan plaş, yağmurluq

**oil-derrick** [ˈɔɪl.derɪk] *n* neft buruğu

**oil-duct** [ˈɔɪl.dʌkt] *tex.* yağ boru kəməri

**oiled** [ˈɔɪld] *adj* yağla hopdurulmuş, yağlı; **well ~** *məc.* çox içmiş, möhkəm sərxoş

**oil-engine** [ˈɔɪl.endʒɪn] *n tex.* neft mühərriki

**oiler** [ˈɔɪləʳ] *n* **1.** yağlayıcı *(peşə)*; **2.** yağ düzəldən; yağ satan; **3.** = **oilskin**; **4.** = **oil-well**; **5.** neftdaşıyan gəmi / tanker; benzin / neft daşıyan maşın; **6.** = **oil-engine**

**oilery** [ˈɔɪlərɪ] *n* rəngsaz dükanı, yağ anbarı, yağ zavodu

**oilfield** [ˈɔɪlfi:ld] *n* **1.** neft yatağı; **2.** neft mədəni

**oil-field** [ˈɔɪl.fi:ld] *n* **1.** neft yatağı; neft bölgəsi; **2.** neft mədəni

**oilfielder** [ˈɔɪlfi:ldəʳ] *n* **1.** neftçi; **2.** neft mədənində işləyən fəhlə

**oil-filter** [ˈɔɪlˈfi:ltəʳ] *n* yağ süzgəci / filtri

**oil-forming** [ˈɔɪl.fɔ:mɪŋ] *adj* yağ əmələ gətirən

**oil-fuel** [ˈɔɪlfju:l] *n* duru yanacaq, neft, mazut

**oil-gear** [ˈɔɪl.gɪəʳ] *tex.* hidravlik ötürmə; hidroötürücü

**oiliness** [ˈɔɪlɪnɪs] *n* **1.** yağlılıq; **2.** suvaşqanlıq, yapışqanlıq

**oiling**[1] [ˈɔɪlɪŋ] *n* **1.** yağlama; **2.** yağlandırma; **3.** yağlayıcı

**oiling**[2] [ˈɔɪlɪŋ] *adj* yağlama; **~ agent** yağlayıcı dərman; **~ system** yağlama sistemi

**oilite** [ˈɔɪlaɪt] *adj* yağlayıcı

**oil-loading** [ˈɔɪl.loudɪŋ] *n* neft doldurma/yükləmə

**oilman** [ˈɔɪlmən] *n amer.* *(pl* **–men** [men]) **1.** neft sənayesi işçisi; neft şirkətinin işçisi, neftçi; **2.** yağ zavodunun işçisi; yağ düzəldən; **3.** yağlayıcı

**oilplant** [ˈɔɪlpla:nt] *n* yağlı bitki, tərkibində yağ olan bitki

**oilproof** [ˈɔɪlpru:f] *adj* yağa davamlı, yağ keçirməyən / buraxmayan



**oilseed** [ˈɔɪlsi:d] *n k.t.* tərkibində yağ olan bitkinin tumu *(çiyidi)*

**oilskin** [ˈɔɪlskɪn] *n* **1.** nazik müşəmbə; **2.** su keçirməyən / buraxmayan parça; **3.** sukeçirməyən / buraxmayan / suyadavamlı parçadan tikilmiş geyim; **dressed in ~** suyadavamlı parçadan tikilmiş paltar geymiş adam

**oil-well** [ˈɔɪlwel] *n* neft quyusu; neftlə dolu rezervuar

**oily** [ˈɔɪlɪ] *adj (-ier, – iest)* **1.** yağlı, yağlanmış; **~ liquid** yağlı maye; **~ hair** yağlı saç; **2.** *məc.* yaltaq; qulluq göstərən; riyakar, ikiüzlü; **~ speech** yaltaq / riyakar nitq

**ointment** [ˈɔɪntmənt] *n* **1.** məlhəm, maz, sürtmə dərmanı; sürtmə; **to apply / to rub in / to rub on an ~** mazı bədənə və ya əşyaya sürtmək; məlhəm qoymaq; **skin ~** dəri sürtküsü; **2.** vazelin

**okay**[1] *(həm də* **O. K.**) [.ouˈkeɪ] *n* razılıq, bəyənmə, icazə; **to get/to receive an ~** razılıq/icazə almaq; **to give an ~** razılıq/icazə vermək, razı olmaq, bəyənmək; *Have they given you their okay? Onlar sənə/sizə razılıq veriblərmi?; We've got the okay from the director at last Biz nəhayət müdirdən razılıq almışıq*

**okay**[2] *(həm də* **OK**) [.ouˈkeɪ] *adj* **1.** doğru, düzgün, həqiqi; *Is your story okay? Sizin / sənin danışdığın / danışdığınız əhvalat doğrudurmu?* **2.** yaxşı, qaydasında; *She seems okay now O indi yaxşı görünür, O indi yaxşıdır*

**okay**[3] *(həm də* **OK**) [.ouˈkeɪ] *v (pt, pp* **okayed / OK'd**; *pr.p* **okaying , Oking**) ; razılaşmaq, razılıq vermək, bəyənmək, *He okayed / OK'd my idea O, mənim fikrimi bəyəndi, O mənim fikrimlə razılaşdı*

**okay**[4] *(həm də* **OK**) [.ouˈkeɪ] *inter Yaxşı! Oldu! Əlbəttə! Razıyam! Baş üstə!; " - Will you help me?" " – OK" " - Mənə kömək edəcəksənmi / edəcəksinizmi?" " – Əlbəttə"; OK, children, let's clean up the room now Yaxşı, uşaqlar, gəlin indi otağı təmizləyək*

**old**[1] [ould] *n* **1.** *top.* i qocalar, yaşlılar, **~ and young** bütün insanlar; **2.** keçmiş zamanlar, qədim zamanlar; **of ~** əvvəllər, əvvəlki zamanda; **from of ~** qədimdən, əzəldən; keçmişdə; **men of ~** keçmiş zaman insanları; **in the days of ~** qədim zamanlarda, keçmiş vaxtlarda; **3.** yaş

**old**[2] [ould] *adj* **(-er, -est) 1.** köhnə; **~ age** qocalıq; **~ people** qocalar, ağsaqqallar, ahıllar; **to grow ~** qocalmaq **2.** təcrübəli, bir işlə uzun müddət məşğul olmuş; **~ campaigner** veteran; *məc.* dünya görmüş adam; **~ hand at** *smth.* bir işdə təcrübəsi olan adam; **3.** qədim, keçmiş; **~ family** qədim nəsil; **~ English** qədim ingilis dili; **~ Norse** qədim skandinav / irland dili; qədim, köhnə *(şərab haq.)*; əla, əntiqə; **to have a high ~ time** *d.d.* yaxşı şənlənmək; **4.** nimdaş; cındır; **5.** keçmiş, sabiq, əvvəlki; **~ boy** sabiq məzun; **6.** *d.d.* dost, yoldaş, aşna; **~ Year's Day** ilin sonuncu günü; **7.** *Tərcümə olunmayan və yaş haqda sual zamanı işlənən və ya şəxsin yaşını göstərən əlavə söz; How old is she? Onun neçə yaşı var?; He is twenty-two years old Onun iyirmi iki yaşı var;*
◊ **~ as the hills** dünya kimi qədim; çox qədim; **an ~ head on young shoulders** yaşına uyğun olmayan müdriklik; **~ man of the sea** qır-saqqız adam; **to come the ~ soldier over** *smb. d.d.* bir kəsə öyrətmək; **~ Gentleman** iblis, şeytan

**olden**[1] [ˈouldn] *adj arx.* qoca, keçmiş, yaşlı, qədim; **in ~ times** keçmişdə, qədimdə, keçmiş vaxtlarda/ zamanlarda

**olden**[2] [ˈouldn] *v* qocalmaq, qocaltmaq

**older** [ˈouldəʳ] *adj* nisbətən yaşlı / qoca

**oldest** [ˈouldəst] *n* ağsaqqal, ən qoca adam

**oldie** [ˈouldɪ] *n d.d. populyarlığını saxlamış köhnə mahnı, film və ya tamaşa*

**oldish** [ˈouldɪʃ] *adj* bir az yaşlı, qocatəhər; *Time is slipping away, and we are getting oldish Vaxt ötür, biz qocalırıq*

**oldster** [ˈouldstəʳ] *n d.d.* yaşlı adam

**oleaginous** [.ouliˈædʒɪnəs] *adj* yağlı, piyli

**oleaginousness** [.ouliˈædʒɪnəsnɪs] *n* yağlılıq, piylilik

**oleander** [.ouliˈændəʳ] *n bot.* oleandr *(qırmızı və ağ çiçəkli həmişəyaşıl kol bitkisi)*

**oleaster** [.ouliˈæstəʳ] *n bot.* **1.** cır / yabanı zeytun; **2.** ensizyarpaq iydə

**olefiant** [.ouliˈfaɪænt] *adj* yağ əmələ gətirən; **~ gas** etilen

**olid** [ˈɔlɪd] *adj* üfunətli, pis iyli

**oligarch** [ˈɔlɪga: k] *n* oliqarx

**oligarchical** [ˈɔlɪga:kɪkl] *n* oliqarx, avtoritar; **~ government** avtoritar hökümət

**olive**[1] [ˈɔlɪv] *n* **1.** *bot.* zeytun ağacı; zeytun; **2.** zeytun yarpağı, zeytun çələngi, zeytun budağı *(sülh rəmzi)*; **3.** zeytun ağacının taxtası; zeytun meşəsi; **4.** oliva cinsindən olan molyusk; molyuskun çanağı *(parıltılı, oval formalı)*; **5.** *aşp.* sarımsaq və göy vurulmuş qalın mal və ya dana əti tikələri; **6.** oval formalı düymə; **7.** zeytun rəngi

**olive**[2] [ˈɔlɪv] *adj* **1.** sarımtıl yaşıl rəng; sarımtıl palıdı rəng; palıdı-sarı *(irq, insan haq.)*; **2.** zeytun; **~ garden** zeytun bağı; **~ crop** zeytun məhsulu; **~ oil** zeytun yağı

**olographic** [.ɔləˈgræfɪk] *adj* holoqrafik; **~ will / testament** şəxsən yazılmış vəsiyyətnamə

**olympiad** [ouˈlɪmpɪæd] *n* **1.** olimpiada; **2.** olimpiadalar arasında olan dörd il müddət *(qədim Yunanıstanda)*

**Olympian**[1] [ouˈlɪmpɪən] *n* **1.** yunan allahı, Olimpin sakini; **the Olympian** Zevs və ya Yupiter; **2.** *məc.* olimpiyalı

**Olympian**[2] [ouˈlɪmpɪən] *adj* **1.** olimpiya; olimpə aid olan; ilahi; **~ calm** olimpiya sakitliyi **2.** əzəmətli, mərhəmətli, iltifatlı

**olympic** [ouˈlɪmpɪk] *adj* olimpiya; **~ games** olimpiya oyunları

**ombudsman** [ˈɔmbudzmən] *n* **1.** ombudsmən *(in-*

*san hüquqları üzrə müvəkkil);* 2. tələbələrin /alıcıların şikayətlərinə baxan şöxs

**omega** [ou'mɪgə] *n* **1.** omeqa *(yunan əlifbasının son hərfi);* **2.** son, bitirmə;
◊ **from alpha to ~** əvvəldən axıra kimi / qədər

**omelet** ['ɔmlɪt] *n* omlet, qayğanaq; **to make an ~** qayğanaq/omlet bişirmək; **cheese ~** pendirli omlet; **mushroom ~** göbələkli omlet; **plain ~** adi omlet, qayğanaq; **savoury ~** ətirli göyərtilər qatmaqla bişirilmiş omlet; **sweet ~** mürəbbəli omlet;
◊ *You can't make an omelette without breaking eggs at. söz Yumurtanı sındırmadan qayğanaq bişirmək olmaz*

**omen**[1] ['oumen] *n* işarə, nişanə, əlamət; **to be of good / ill ~** bir işin yaxşı/yaman olacağının əlaməti olmaq

**omen**[2] ['oumen] *v* bir şeydən xəbər vermək, bir şeyin əlaməti olmaq

**ominous** ['ɔmɪnəs] *adj* **1.** uğursuz; **2.** qorxunc, təhlükəli; **~ silence** qorxunc / təhlükəli sükut

**omissible** [ou'mɪsɪbl] *adj* vacib olmayan, cüzi, atıla bilən

**omission** [ə'mɪʃn] *n* **1.** buraxma; **2.** səhv, səhlənkarlıq; **3.** fəaliyyətsizlik, hərəkətsizlik; dinməmə; **false ~** yalançı sükut; **intentional ~** qəsdən / bilərəkdən fəaliyyətsizlik

**omit** [ə'mɪt] *v* **1.** buraxmaq, daxil etməmək; **2.** etinasızlıq etmək, əldən buraxmaq / qaçırmaq; **~ doing/ to do *smth.*** nə isə etməmək, nəyi isə əldən buraxmaq

**omnibus**[1] ['ɔmnɪbəs] *n* **1.** omnibus; avtobus; **2.** *parterdə yerləşən geniş ümumi loja;* **3.** məcmuə, bir cildli kitab *(müəllifin hər hansı bir prinsip üzərində toplanmış əsərləri);* **4.** köməkçi; ofisiantın assistenti / köməkçisi

**omnibus**[2] ['ɔmnɪbəs] *adj* çoxamilli, bir çox əşya və müddəaya aid olan, bir neçə əşyanı və ya müddəanı əhatə edən; **~ edition** əsərlərin tam külliyyatı / toplusu; **~ resolution** bir sıra məsələlər üzrə ümumi qətnamə; **~ train** bütün dayanacaqlarda dayanan sərnişin qatarı; **~ bill / clause** müxtəlif məsələlər üzrə qanun layihəsi; qanunun çoxamilli maddəsi; **~ letter** bir neçə şəxsə ünvanlanmış məktub; **~ book / volume** məcmuə, bir cildli kitab; **~ ticket** eyni zamanda bir neçə şəxs üçün keçərli olan bilet

**omnicide** ['oumnɪsaɪd] *n* tam məhv olma

**omnidirectional** ['ɔmnɪdɪ'rekʃənl] *adj* bütün istiqamətlərdə fəaliyyət göstərən; müəyyən fəaliyyət istiqamətinə malik olmayan; hər tərəfdən radio dalğalar alan və göndərən; **~ antenna** hər tərəfdən radio dalğalar alan və göndərən antenna

**omnifarious** [ˌɔmnɪ'feərɪəs] *adj* müxtəlif, çeşidli, hər cür, hər tərəfli; **~ reading** sistemsiz oxu; **~ erudition** hər tərəfli erudisiya

**omniparity** ['ɔmnɪ'pærɪtɪ] *n* ümumi bərabərlik

**omnipotence** [ɔm'nɪpətns] *n* hər şeyə qadirlik, qüdrətlilik *(xüs. Allah haq.)*

**omnipotent** [ɔm'nɪpətnt] *adj* **1.** hər şeyə qadir, qüdrətli *(xüs. Allah haq.);* **2.** *d.d.* əsl; **~ villain** əsl əclaf / yaramaz / dələduz

**omnipresence** ['ɔmnɪ'prezns] *n* hər yerdə mövcudluq *(xüs. Allah haq.)*

**omnipresent** ['ɔmnɪ'preznt] *adj* hər yerdə mövcud olan *(xüs. Allah haq.)*

**omnirange** ['ɔmnɪ'reɪndʒ] *n* hər istiqamətə işıq verən mayak

**omniscience** [ɔm'nɪsɪəns] *n* hər şeydən xəbərdar olma; hər şeyi bilən Allah; universal/hərtərəfli biliklər

**omniscient** [ɔm'nɪsɪənt] *adj* hər şeydən xəbərdar, hər şeyi bilən *(xüs. Allah haq.)*

**omnivorous** [ɔm'nɪvərəs] *adj* **1.** hər şeyi yeyən, hər şeyi udan; **2.** *məc.* heç bir şeyə fərq qoymayan, ağına-bozuna baxmayan

**omphalocele** *n* ['ɔmfələ.si:l] *tib.* göbək qrıjası /dəbəliyi

**omphalos** ['ɔmfələs] *n* **1.** *tib.* göbək; **the spiritual ~ of the world** dünyanın mənəvi / ruhi mərkəzi; **2.** mərkəzi nöqtə *(nadəsa)*

**omphalotomy** ['ɔmfə'lɔtəmɪ] *n tib.* göbəkkəsmə əməliyyatı

**on**[1] [ɔn] *adv* **1.** *Hal-hazırda baş verən / davam edən hərəkətlərə işarə edir: Is the radio on? Radio işləyirmi?; Don't you know there's a war on? Bilmirsənmi / bilmirsinizmi ki, müharibə gedir?;* **2.** *Hərəkətin davam etdirilməsinə işarə edir:* **to work ~ / to write ~ / to read ~, etc.** işləməyi / yazmağı / oxumağı davam etdirmək; *Go on! Davam et /edin; Go on reading! Oxumağı davam et/edin; The battle still went on Döyüş hələ də davam edirdi;* **3.** *Müəyyən bir vaxta yaxınlaşmanı bildirir: It is getting on for 6 o'clock Tezliklə saat 6 olacaq; She's going on for 5 Onun yaxınlarda 5 yaşı olacaq;* **4.** *Məkan və zamanca uzaqlaşmanı bildirir:* **further ~** sonra, daha sonra; **later ~** daha/bir azdan sonra; **from now ~** bu gündən /vaxtdan başlayaraq; **from that day ~** o gündən; **5.** *Hərəkətin yaxud prosesin davam etməsinə və ya başlanmasına işarə edir: The game is on Oyun davam edir: The play was on for months Pyes aylarla oynanılı; What's on today? Bu gün nə gedir (kinoteatrda və s.); The rain is on again Yağış yenə yağır; Breakfast is on from 8 p.m. to 10 p.m. Səhər yeməyi saat 8-dən 10-a kimi verilir; The crisis came on Böhran başlandı;* **6.** *Mexanizmin, cihazın, sistemin və s. işə salınmasına işarə edir:* **to turn ~ the light / the gas** işığı / qazı yandırmaq; **to turn ~ the tap** kranı açmaq; *The machine is on Maşın işləyir; The radio is on Radio işləyir;* **to put the breaks ~** tormozlamaq, tormoz vermək; **7.** *Paltarı geyməyə və ya geyinilmiş olmasına işarə edir:* **to have *one's* shoes ~** ayağında ayaqqabısı olmaq; *What had she on? Onun əynində nə vardı, O nə geyinmişdi?; He*



*had his spectacles on O, eynəyini taxmışdı*
◊ **to be ~ to *smb.*** **1)** kiminsə hiyləsini başa düşmək; **2)** kiminləsə əlaqə saxlamaq *(telefonla və s.);* **3)** kiməsə ilişmək/ sataşmaq; **4)** kiminsə izinə düşmək; **~ and off** zaman-zaman, hərdən; **and so ~** və sairə, və ilə axır

**on**[2] [ɔn] *prep Azərbaycan türkcəsinə yerlik hal şəkilçisi* **(-da; -də)** *vasitəsilə tərcümə olunur və ya tərcümə olunmur və aşağıdakı mənaları verir:* **1)** *Fəza mənasında hər hansı bir əşyanın üstündə olmaq anlayışı ifadə edir:* **a house ~ the hill** təpə üstündə ev; **2)** *coğrafi adlarda hər hansı çay üzərində yerləşməni ifadə edir:* **Stratford-on-Avon** Eyvon üzərində Stratford; **3)** *Dünyanın cəhətlərində olmanı göstərir: amer.* **~ the north** şimal**da** **4)** *bir şeyin yanında, yaxınlığında olmanı ifadə edir:* **~ the continent** qitədə; **5)** *Fəza mənasında bir şeyin səthi üzərində hərəkət etməyi ifadə edir:* **~ the water** suyun üstü ilə, suyun səthi ilə; **6)** *Hərəkətin bir şey istiqamətinə yönəldilməsini ifadə edir: The window opens on the street Pəncərə küçəyə açılır;* **7)** *Zaman anlayışında həftənin müəyyən bir gününə, dəqiq tarixə və ana işarət edir:* **~ Sunday** bazar günü; **~ the 1st of April** aprelin birində; **8)** *Günün müəyyən vaxtına işarət edir: amer.* **~ the morning** səhər-səhər; **9)** *Hadisələrin ardı-ardınca bir hadisədən sonra baş verməsinə işarət edir:* **cash ~ delivery** çatdırılma zamanı ödəniş; **~ reaching home** evə çatanda; **10)** *Hadisələrin, hərəkətlərin müəyyən hadisə zamanı eyni vaxtda cərəyan etməsinə işarət edir:* **~ a trip** səyahət zamanı; **11)** *Kitabın, çıxışın, danışıqların, mübahisələrin mövzusunun nə barədə olmasına işarət edir:* **a debate ~ *smth.*** bir şey barəsində mübahisə; **12)** *Hal-hazırda şəxsin üstündə bir şeyin mövcudluğuna işarət edir: I have no money on me Mənim üstümdə pul yoxdur;* **13)** *Bir şeyin əsasına, şərtinə, səbəbinə işarət edir:* **~ such terms** bu cür şərtlər əsasında; **~ account of... ...** səbəbdən, ... üzündən, ... ucbatından; **profit ~ the sale of ... ...** satılmasından alınan gəlir; **14)** *Hərəkətin tərzinə işarət edir:* **all ~ a tremble** həyəcan içində; **15)** *Hərəkət vasitəsinə işarət edir:* **~ a train** qatarla; **16)** *Hərəkətin icra alətinə işarət edir:* **to cut *one's* finger ~ a knife** bıçaqla barmağı kəsmək; **17)** *Yaşamaq vasitəsinə işarət edir:* **to live ~ *one's* parents'** valideynlərin hesabına yaşamaq; valideynlərin himayəsi altında olmaq; **18)** *Qida vasitəsinə işarət edir:* **to live ~ fruits** meyvə ilə yaşamaq/dolanmaq; **19)** *Hər hansı idarədə işləməyə işarət edir:* **to be ~ the committee** komitənin üzvü olmaq; **20)** *Bir şeyin tərkibində olmağa işarət edir:* **~ the programme** proqramda, proqramın tərkibində; **21)** *Hər hansı vəziyyətdə, prosesdə olmağa işarət edir:* **~ leave** məzuniyyətdə; **to be ~ fire** od içində yanmaq; **22)** *Münasibətlərin xarakterinə işarət edir:* **to be ~ a friendly footing with *smb.*** bir kəslə dost münasibətində olmaq; **23)** *Hərəkətin obyektinə işarət edir:* **to work ~ *smth.*** bir şey üzərində işləmək; **24)** *Təxminlik, qeyri-dəqiqlik ifadə edir:* **just ~ 5 years ago** təxminən 5 il bundan əvvəl; **25)** *Adına çek yazılmış, bilet alınmış və ya sifariş edilmiş şəxsə işarət edir:* **tickets ~ you** sizin adınıza bilet

**once**[1] [wʌns] *n* bir dəfə, yalnız bir dəfə; **for** *(this)* **~** bu dəfə, istisna kimi; *He had to do it but this once Bu dəfə o bunu etməli oldu; Once is enough Bir dəfə kifayətdir*

**once**[2] [wʌns] *adj* əvvəlki, sabiq, keçmiş; köhnə; **my ~ husband** mənim əvvəlki ərim

**once**[3] [wʌns] *adv* **1.** bir dəfə; günlərin birində, günlərin bir günü; **~ a day / month / year etc.** gündə, ayda, ildə və s. bir dəfə; **more than ~** dəfələrlə; **~ and for all** ömürlük, birdəfəlik; **~ or twice** bir və ya iki dəfə; **not ~, never ~** heç vaxt, bir dəfə belə; **~ again, ~ more** bir daha; **~ and again, ~ or more** bir neçə dəfə, vaxtaşırı; bəzən, nadir hallarda; **~ in a while, ~ in a way** hərdənbir, zaman-zaman; **if ~ , when ~** heç olmasa bir dəfə; **all at ~** gözlənilmədən, qəflətən; **2.** nə vaxtsa, bir zaman; **~ upon a time, there was ~** biri var idi, biri yox idi...*(nağılların başlanğıcında);* keçmiş hadisələr; *So runs this once-upon-a-time in my memory Keçmiş hadisələrin xatirələri bax beləcə yaddaşımdan ötüb keçir; I was very much in love with her once Bir vaxt mən onu çox sevirdim;* **3.** nə vaxtsa, bir vaxt *(gələcəkdə); Britons and Saxons shall be once one people Britaniyalılar və sakslar nə vaxtsa vahid xalq olacaq; You may be once old as I am Bir vaxt sən də mənim kimi qocalacaqsan; Once I'm going to be there Nə vaxtsa mən oraya gedəcəyəm;*
◊ **~ in a blue moon** çox nadir hallarda; *A man can die but once Adam bir dəfə ölər; Once bit, twice shy at.söz İlan vuran ala çatıdan qorxar; Once a liar, always a liar at.söz Bir kərə yalan danışan həmişə yalan danışar;* **~ in a lifetime** *məc.* ömürdə bir dəfə; **~ over lightly** ötəri, cəld, gözucu

**once**[4] [wʌns] *conj* *dərhallıq bildirir; bəzən tərcümə olunmur; (If) once you speak you are dead Bir söz desən/desəniz belə, özünü/özünüzü ölmüş bil/bilin; When once she asks I'd do anything Təki o məndən xahiş etsin, mən hər şey edərəm; I never once lied to you Mən sizə heç vaxt yalan söyləməmişəm;*
◊ **more than ~** dəfələrlə; **~ and only ~** yalnız və yalnız bir dəfə; **~ again** yenidən; **~ more** yenə də, bir daha

**oncer** ['wʌnsəʳ] *n d.d.* **1.** nəyisə təkcə bir dəfə edən insan/adam; kilsəyə yalnız bazar günü gedən ibadətçi; ömrü boyu yalnız bir kişisi olan qadın; **2.** *d.d.* bir funtluq banknot

**oncological** [ˌɔnkə'lɔdʒɪkl] *adj* onkoloji

**oncology** [ɔn'kɔlədʒɪ] *n* onkologiya, şiş haqda elm
**oncoming**[1] ['ɔn.kʌmɪŋ] *n* yaxınlaşma, irəliləyiş, hücum
**oncoming**[2] ['ɔn.kʌmɪŋ] *adj* 1. yaxınlaşan; ~ **traffic** üzbəüz gələn / əks istiqamətli hərəkət; 2. gələcək, olacaq; ~ **visit** gələcək səfər; 3. xoşxasiyyət, nəzakətli
**oncost** ['ɔn.kɔst] *n* əlavə xərclər
**ondatra** [ɔn'dætrə] *n zool.* ondatra *(gəmiricilər sinfindən olan heyvan)*
**one**[1] [wʌn] *n* 1. bir *(say)*; **the row of ~s** birlərin sırası; 2. tək, tənha; ~ **by** ~ birbəbir, ayrılıqda, ayrıca, bir-bir; 3. bir il *(yaş haqqında)*; saat *(vaxt anı)*; birinci ölçü *(geyim)*; bir dollarlıq pul; 4. *əvvəl işlədilmiş sözü təkrar etməmək üçün əvəzedici kimi işlədilir; I have a red hat But I don't have a blue one Mənim qırmızı papağım var, lakin mavi papağım yoxdur;* 5. *insan mənasında işlədilir;* **the great ~s of the earth** dünyanın nəhəng şəxsiyyətləri; *d.d.* bir işdə entuziast olan şəxs;
◊ **at** ~ birgə, birlikdə; həmrəy; **all in** ~ hamı bir yerdə; **to be made** ~ evlənmək, kəbin kəsdirmək; **for** ~ məsələn; *I for one disagree Mən, məsələn, narazıyam*
**one**[2] [wʌn] *adj* 1. yeganə, nadir, özünəməxsus; *The one person she wanted to marry Ərə getmək istədiyi yeganə insan;* 2. müəyyən; yeganə; ~ **fine person** yeganə yaxşı insan; 3. eyni, həmin cür; *They are both of one species Onlar ikisi də eyni növə aiddirlər; I am one with you on this Mən bu məsələdə səninlə həmrəyəm;* 4. hansısa bir, qeyri-müəyyən, məchul; *I will see you again one day Biz səninlə bir gün / nə vaxtsa görüşəcəyik*
**one**[3] [wʌn] *num* 1. bir; ~ **book** bir kitab; ~ **million** bir milyon; ~ **half** yarım; ~ **third** üçdə bir; ~ **pound ten pence** bir funt on pens; 2. birinci; ~ **chapter** ~ birinci fəsil;
◊ ~ **too many** həddən artıq çox; ~ **or two** bir yaxud iki
**one**[4] [wʌn] *pron* 1. kimsə, hər hansı bir, naməlum şəxs, bəzisi; *Some of them couldn't eat a thing. One couldn't even drink Onlardan bəzisi heç bir şey yeyə bilmirdi. Bəziləri hətta içə bilmirdi;* 2. *qeyri-müəyyən şəxsli cümlələrdə işlədilir; Where does one go from there? Oradan haraya getmək olar?*
◊ **in the year** ~ çox qədimdə; **any** ~ kim olursa olsun
**onefold** ['wʌnfould] *adj* 1. asan, yüngül, sadə; 2. sadəlövh, səmimi
**one-handed** ['wʌn'hændɪd] *adj* birəlli, təkəlli, birqollu, təkqollu
**one-hoofed** ['wʌn'hu:ft] *adj* təkdırnaqlı *(heyvan haq.); A horse is one-hoofed animal At təkdırnaqlı heyvandır*
**one-horse** ['wʌn'hɔ:s] *adj* 1. təkatlı, biratlı, tək at qoşulan; ~ **cart** tək atlı araba; 2. *d.d.* zəif, kasıb; ~ **vocabulary** zəif lüğət; ~ **argument** zəif arqument / dəlil
**one-legged** ['wʌnlegd] *adj* 1. təkayaqlı, birayaqlı; 2. yarımçıq; birtərəfli; məhdud
**oneness** ['wʌnnɪs] *n* 1. yeganəlik; müstəsnalıq, unikallıq; 2. tənhalıq; 3. vahidlik, tamlıq; 4. ittifaq, birlik *(iki və daha artıq adam və ya əşya); The closest human oneness is of husband and wife İnsanların ən sıx birliyi ər-arvadlılıqdır;* 5. eynilik; dəyişməməzlik; 6. razılıq, həmrəylik, həmfikirlilik
**oner** ['wʌnə'] *n d.d.* 1. korifey, bir şeyi mükəmməl bacaran və ya bilən adam; nadir; çox nadir bir şey; 2. *id.* möhkəm, bərk zərbə *(boksda); Jim caught him a oner on the head Cim onun başına möhkəm zərbə endirdi;* 3. *d.d* xal *(oyunda)*
**onerous** ['ɔnərəs] *adj* ağır; çətin; ~ **task** çətin tapşırıq; ~ **duties** çətin vəzifələr
**oneself** [wʌn'self] *pron* 1. öz-özünü, özünə, özünü; **to hurt** ~ özünü incitmək; **to do** *smth.* ~ bir şeyi özü etmək; 2. özü özünə, özü özünü
◊ **to come to** ~ 1) hüşü başına gəlmək, özünə gəlmək; 2) ağlını toplamaq
**onfall** ['ɔnfɔ:l] *n* hücum, həmlə, təzyiq
**onflow** ['ɔnflou] *n* axın, sel; ~ **of blood** qan axını; ~ **of information** informasiya axını
**onion**[1] ['ʌnjən] *n bot.* 1. soğan, baş soğan; 2. *d.d.* baş; **to be off** *one's* ~ ağlını itirmək, havalanmaq;
◊ **to know** *one's* **~s** öz işini yaxşı bilmək; bir şeyi əzbərdən bilmək
**onion**[2] ['ʌnjən] *adj* soğan; ~ **soup** soğan şorbası / bozbaşı; ~ **salad** soğan salatı
**onion**[3] ['ʌnjən] *v* 1. soğan qatmaq, soğan əlavə etmək; 2. soğan sürtməklə göz yaşartmaq
**onion-skin** ['ʌnjənskɪn] *n* 1. soğan qabığı; 2. nazik hamar kağız
**oniony** ['ʌnjənɪ] *adj* soğan, soğanlı; ~ **odour** soğan iyi/ qoxusu; ~ **omelette** soğanlı omlet
**onlooker** ['ɔn.lukə'] *n* tamaşaçı, müşahidəçi; təsadüfi şahid; *The onlooker sees most of the game at.söz.* ≅ *Kənardan baxana döyüş asan gəlir*
**only**[1] ['ounlɪ] *adj* 1. tənha; yeganə; **an ~ child** yeganə uşaq; **one and** ~ təkcə, yeganə; unikal; 2. bənzərsiz, müqayisə edilməyən
**only**[2] ['ounlɪ] *adv* 1. yalnız, istisna olmaqla; yeganə; ~ **just** elə bu dəqiqə; ~ **not** az qala, demək olar ki,... **if** ~ əgər, yalnız...; 2. bu yaxınlarda, indicə; *I have only just talked to her Mən elə indicə onunla danışdım*
**only**[3] ['ounlɪ] *conj* ancaq, lakin, amma; *He makes good resolutions, only never keeps them O, yaxşı qərarlar qəbul edir, lakin heç vaxt onlara riayət etmir*
**onomasiology** [.ɔnoumæsɪ'ɔlədʒɪ] *n* onomasiologiya *(adlar haqqında elm)*



**onrush** ['ɔnrʌʃ] *n* hücum, təcavüz, təzyiq; sürətli irəliləyiş; ~ **of technology** texnologiyanın sürətli inkişafı
**onset** ['ɔnset] *n* 1. hücum, təcavüz, təzyiq; **to give the** ~ hücum etmək; ~ **of wind** külək güclənməsi; *məc.* tutma *(ağrı və ya xəstəlik)*; 2. başlanğıc; **to give the** ~ başlamaq; 3. *fon.* hecanın başlanğıc samitləri
**onshore**[1] [.ɔn'ʃɔ:'] *adj* 1. sahilə / quruya hərəkət edən; 2. sahil; sahilin ləpədöyən zonaya qədər olan hissəsi; ~ **wind** dəniz küləyi *(dənizdən quruya əsən)*; 3. sahildə olan, quruda olan
**onshore**[2] [.ɔn'ʃɔ:'] *adv* sahil istiqamətində
**onstage**[1] [.ɔn'steɪdʒ] *adj* teatr; səhnə; ~ **decors** səhnə dekorasiyaları
**onstage**[2] [.ɔn'steɪdʒ] *adv* səhnədə, səhnəyə
**onstream** [.ɔn'stri:m] *adj* 1. istismar prosesində olan; 2. fəaliyyətdə olan, işləyən, cari; **to come** ~ istismara vermək *(neft yatağını)*; **to go** ~ istismara başlamaq *(neft yatağı haq.)*; **to have some wells** ~ bir neçə quyunu istismar etmək
**onto** ['ɔntu] *prep* 1. -a, -ə; üstündə, üstünə; *He jumped onto a bus O atılıb avtobusa mindi;* 2. *kimisə məlumatlandırmaq, kiməsə işi başa salmaq mənasına işarə edir: Put me onto your ideas İdeyalarınızı mənə başa salın*
**ontogenesis** [.ɔntou'dʒenɪsɪs] *n biol.* ontogenez
**ontological** [.ɔntə'lɔdʒɪkəl] *adj* ontoloji
**ontology** [ɔn'tɔlədʒɪ] *n* ontologiya, toplu
**onus** ['ounəs] *n* mənəvi yük; vəzifə, məsuliyyət; ~ **probandi** *hüq.* sübutun ağırlığı / məsuliyyəti
**onward**[1] ['ɔnwəd] *adj* irəliləyən, hərəkət edən; ~ **movement** irəliyə doğru hərəkət
**onward**[2] ['ɔnwəd] *adv* irəli, irəlidə; sonra, qabağa; **from this time** ~ bu vaxtdan sonra; **to move** ~ irəliyə hərəkət etmək
**onyx** ['ɔnɪks] *n miner.* oniks
**oodles** ['u:dlz] *n d.d.* böyük / küllü miqdar, bir qalaq; ~ **of money** bir yığın / bir qalaq pul
**ooh** [u:] *int.* oh!; uh!; *(Təəccüb, heyranlıq, qorxu və s. ifadə edir)*
**oops** [ups] *int.* hop!; vay!; oh!; uh!; *(Qorxu, həyəcan, öz səhvinə və bacarıqsızlığına təəccüb bildirərkən işlədilir)*
**ooze**[1] [u:z] *n* I 1. lil; yapışıqlı palçıq *(çayın, gölün, okeanın və s. dibində)*; ~ **-bank** lilli sahil *(çayın və s.)*; bataqlıq; çətin keçilən lığ; 2. balıqqulağılıq, əhəng, okeanın dibində əhəng qatları; 3. dəri aşılamaq üçün maye; 4. aşılanmış möhkəm dana dərisi *(ayaqqabı, kitab cildi və s. hazırlanmasında istifadə edilir)*; 5. damma, süzülmə; nəmişliyin yavaş-yavaş üzə çıxması; asta sakit axın, ahəstə axma *(maye haq.)*
**ooze** [u:z] *n* II qısa tük *(yun və ya yun sapdan ayrılan)*
**ooze**[2] [u:z] *v* 1. asta-asta axmaq; üzə çıxmaq *(nəm, su və s)*; axıb getmək; *The creek is oozing its way through rocks and slime Kiçik çay palçıq və daşların arasından süzülür;* 2. *məc.* yayılmaq *(informasiya)*, axmaq, saçmaq *(işıq və s.)*; 3. sakit əsmək *(külək)*; 4. yayılmaq; *His face was oozing a smile as he saw her Qızı görən kimi onun üzünə təbəssüm yayıldı;* 5. sovuşmaq, sıyrılıb getmək, gözdən itmək, yox olmaq *(fiziki obyektlər haq.)*
**oozing** ['u:zɪŋ] *n* 1. süzülmə; 2. ayrılma
**oozy** ['u:zɪ] *adj* 1. lilli; lığlı; 2. nəmlik buraxan
**opacification** [.oupæsɪfɪ'keɪʃn] *n* səsi boğma
**opacifier** [.oupæsɪ'faɪə'] *n* səs boğucu
**opacity** [ou'pæsɪtɪ] *n* 1. kölgələnmə, dumanlanma, dumanlılıq, qaranlıq; yarımşəffaflıq, tutqunluq; 2. *məc.* qaranlıq, qeyri-aydınlıq, qeyri-müəyyənlilik *(fikir, məna və s. haq.)*; 3. axmaqlıq, kütlük, fərsizlik; *He's such an opacity! O lap fərsizdir/ axmaqdır!;* 4. *dilç.* qeyri-müntəzəmlik *(fonoloji qayda, qanun haq.)*;
◊ **acoustic** ~ səs keçirməmə; ~ **of paper** kağızın qeyri-şəffaflığı
**opaque**[1] [ou'peɪk] *n* qaranlıq, zülmət
**opaque**[2] [ou'peɪk] *adj* 1. qeyri-şəffaf; işıq keçirməyən; 2. keçirməyən *(enerji, işıq, istilik və s. haq.)*; 3. tutqun, parıltısız; ~ **film** qeyri-şəffaf lent; 4. anlaşılmaz; 5. axmaq, küt
**opaqueness** [ou'peɪknɪs] *n* qeyri-şəffaflıq; tutqunluq
**open**[1] ['oupn] *n* 1. dəlik, deşik; quyu, yarıq; 2. çayın mənsəbi, deltası; 3. açıq quru sahə, açıq dəniz; 4. açıq yarış, açıq turnir; 5. aşkarlıq, aydınlıq, məlum olma; **life in the** ~ açıq həyat *(hamıya məlum)*;
◊ **to come out into the** ~ səmimi olmaq, gizlətməmək *(mövqe və fikirləri)*
**open**[2] ['oupn] *adj* 1. açıq; ~ **window /door /gate /box** açıq pəncərə /qapı /darvaza / qutu; ~ **letter** açıq məktub *(qəzetdə və s.)*; **an ~ road** açıq yol; **the ~ sea** açıq dəniz; ~ **market** açıq bazar; ~ **port** açıq liman; ~ **season** açıq mövsüm *(ov və ya balıqçılıq üçün)*; **to leave the door / the window / the gate** ~ qapını / pəncərəni / darvazanı açıq qoymaq; **to break the door** ~ qapını qırıb açmaq / sındırmaq; **with ~ eyes** açıq gözlə; *məc.* düşünülmüş şəkildə, bütün nəticələri nəzərə alaraq; ~ **sore** açıq yara; **to tear** ~ açmaq *(məktubu, paketi)*; ~ **boat** göyərtəsiz gəmi; 2. açıq *(geyim haq.)*, aralı *(ağız haq.)*; *He stood there with his mouth wide open O, orada ağzı açıq vəziyyətdə dayanmışdı;* **an ~ coat** yaxası düymələnməmiş palto; 3. meylli, həssas, mail; ~ **to doubts** şübhəyə meylli; 4. boş, məşğul olmayan *(zaman haq.)*; ~ **water** buz örtüyündən təmizlənmiş su; *Keep that hour open for me Bu saatı mənim üçün boş saxla (ünsiyyət üçün)*; azad *(yol haq.)*; 5. vakant, boş; *The job is still open Bu iş yeri hələ də vakantdır / boşdur;* 6. bitməmiş, həll edilməmiş; *That problem remained open Problem həll edilməmiş qaldı;* 7. açıq, tikili ol-

mayan *(yer, sahə haq.)*; **8.** əliaçıq, qonaqpərvər; səmimi, diqqətli, haya çatan; **9.** yumşaq; boş *(torpaq haq.)*; **10.** *fon.* açıq *(hecanın, səsin növü haq.)*; ~ **syllable** açıq heca;

◊ **to force an ~ door** açıq qapını döymək, aydın həqiqəti isbat etməyə çalışmaq; ~ **champion** açıq yarışın qalibi; ~ **ice** şimal səyahətinə mane olmayan buz örtüyü; ~ **verdict** *hüq.* cinayətin baş verməsi, lakin cinayətkarın müəyyən edilməməsinin etirafı; ~ **door** *iqt.* açıq qapılar siyasəti; **Open University** qiyabi universitet *(Londonda 1971-ci ildə təməli qoyulmuşdur. Burada tədris xüsusi radio və televiziya proqramları vasitəsi ilə aparılır)*

**open[3]** ['oupn] *v* **1.** açmaq, açılmaq, aralanmaq, aralamaq; **to ~ a door / a gate / a window** qapı / darvaza / pəncərə açmaq; **to ~ out** *one's* **arms** qollarını açmaq; **to ~ out the wings** qanadlarını açmaq; **to ~ a prospect** gələcəyə qapı açmaq; **to ~ the mind** dünyagörüşünü genişləndirmək; fikrini bölüşdürmək *(kiminləsə)*; *He opened his mind to his guardian O öz tərbiyəçisi ilə fikrini bölüşdürdü;* **2.** *məc.* yol açmaq *(bir işi həyata keçirmək üçün)*, imkan yaratmaq *(bir şey etməyə)*; **3.** genişlənmək; böyümək, açılmaq *(mənzərə haq.)*: *A beautiful sight opened in front of us Qarşımızda gözəl mənzərə açıldı;* **4.** başlamaq; **to ~ the concert** konserti açmaq, konserti başlamaq; **5.** nümayiş etdirmək, göstərmək; **6.** maarifləndirmək, agah etmək; **7.** təməlini qoymaq, kəşf etmək; **8.** fikir söyləmək; *Finally he opened freely on the subject Nəhayət o bu məsələ haqda açıq fikir söylədi;* **to ~ into** birindən o birisinə yol açmaq *(otaq haq.)*; **9.** yaratmaq, qurmaq; **to ~ up relations** münasibətlər qurmaq/ yaratmaq; **to ~ up opportunities** imkanlar yaratmaq; **to ~ ground** torpağı şumlamaq; torpağı hazırlamaq *(əkin üçün)*

**opencast** ['oupnka:st] *adj* açıq üsulla əldə edilmiş; ~ **coal** açıq üsulla əldə edilmiş kömür; ~ **mining** açıq üsulla aparılan mədən işləri

**opener** ['oupnə[r]] *n* **1.** konservaçan; **2.** *tib. d.d.* qarın boşaldıcı; **3.** başlanğıc hadisə; *id.* beysbol oyununda birinci hissə; **for/as ~s** başlanğıc üçün/olaraq

**opening[1]** ['oupnıŋ] *n* **1.** açma, aralama; **2.** dəlik, deşik, çat, boşluq, ara; **3.** kanal; körfəz; **4.** yarıq; keçid *(dağlarda)*; **5.** başlanğıc; giriş; giriş hissə; premyera; debüt *(şahmat)*; **6.** açıq fəza; **7.** meşədə ağaclar kəsilmiş sahə, tala; **8.** kitabın açılmış səhifələri; **9.** əlverişli imkan; **10.** boş iş yeri

**opening[2]** ['oupnıŋ] *adj* **1.** başlanğıc, birinci, ilk; **2.** giriş, açılış; **3.** *tib.* qarın boşaldan ~ **medicine** qarın boşaldan dərman; **4.** açılmış; açıq

**openly** ['oupnlı] *adv* açıq, açıqca; səmimi, açıq-aydın; **to discuss a question** ~ məsələni açıq müzakirə etmək; **to speak** ~ açıq/səmimi danışmaq

**open-minded** ['oupn'maındıd] *adj* **1.** geniş dünyagörüşünə malik olan; **2.** səhv mülahizələrə inanmayan, yanlış rəylərə əsaslanmayan; qərəzsiz, obyektiv, vicdanlı; **3.** zəkalı, zehnli, qabil, istedadlı, fərasətli

**open-mindedly** ['oupn'maındıdlı] *adv* **1.** geniş; geniş surətdə; **2.** səhv mülahizələrə inanmadan / əsaslanmadan, qərəzsiz, obyektiv, vicdanlı

**open-mindedness** ['oupn'maındıdnıs] *n* **1.** dünyagörüşünün genişliyi; **2.** qabiliyyət, istedad, fərasət, qavrama / dərk etmə qabiliyyəti, həssaslıq

**open-mouthed** ['oupn'mauðd] *adv* ağzıaçıq; **to stand** ~ ağzıaçıq dayanmaq; *The children stared open-mouthed at the huge cake Uşaqlar ağzıaçıq halda gözlərini nəhəng torta zilləmişdilər*

**openness** ['oupnnıs] *n* açıqlıq; düzlük, səmimilik, ürəyiaçıqlıq, doğruçuluq

**opera** ['ɔpərə] *n* **1.** opera; **at the ~** operada; **to perform / to stage an ~** opera səhnəyə qoymaq; **comic ~** komik opera; **grand ~** böyük opera; **horse ~** kovboylar haqda televiziya operası; **light ~** operetta; **vest pocket ~** bir aktlı opera; **2.** opera sənəti

**operability** [.ɔpərə'bılıtı] *n* **1.** təsir, təsir qüvvəsi, kəsər; **2.** istismar və istifadədə asanlıq **3.** istismara yararlılıq; ~ **of process** prosesin texnoloji elastikliyi; **all-weather** ~ hər cür hava şəraitində işə yararlılıq; **failure-free** ~ daimi istismar üçün yararlılıq; **stable** ~ sabit yararlılıq; **unstable** ~ qeyri-sabit yararlılıq

**operable** ['ɔpərəbl] *adj* **1.** həyata keçirilə bilən, real; **2.** işləyən, cari; **3.** *tib.* üzərində cərrahiyyə əməliyyatı aparıla bilən

**opera-glass(es)** ['ɔpərə'gla:s(ız)] *n* opera binoklu

**opera-house** ['ɔpərəhaus] *n* opera teatrı *(bina)*

**operate** ['ɔpəreıt] *v* **1.** işləmək, fəaliyyət göstərmək, hərəkətdə olmaq; işlətmək; **2.** təsir göstərmək; *He knew how to operate on the opposite party O, müxalifət partiyasına necə təsir göstərməyi bilirdi;* **3.** səmərə vermək; təsir göstərmək *(dərman haq.)*; *He had taken purging medicine which had immediately operated O, işlətmə dərmanı atdı və dərman dərhal təsirini göstərdi;* **4.** *tib.* cərrahiyyə əməliyyatı keçirmək/aparmaq; *The surgeon operated on her for appendicitis Cərrah onun kor bağırsağında əməliyyat apardı;* **5.** *mal.* səhmlərlə əməliyyat həyata keçirmək *(alğı-satqı və s.)*; **6.** *hərb.* əməliyyat keçirmək, hərbi əməliyyatlar aparmaq; *We operated successfully on the coast Biz sahil boyunda müvəffəqiyyətli hərbi əməliyyatlar apardıq;* **7.** rəhbərlik etmək, idarə etmək; *The company operated a large foundry Şirkət böyük poladəritmə sexinə rəhbərlik edirdi;* **8.** hərəkətə gətirmək, işə salmaq; idarə etmək; **9.** işləyib hazırlamaq, istismar etmək

**operated** ['ɔpəreıtıd] *adj* idarə edilən; **remotely** ~ uzaqdan idarə edilən

**operatic** [.ɔpə'rætık] *adj* **1.** opera; ~ **singer** opera müğənnisi; **2.** dramatik; romantik *(üslub haq.)*



**operating** ['ɔpəreıtıŋ] *adj* **1.** cərrahiyyə; ~ **knife** cərrahiyyə bıçağı; ~ **table** cərrahiyyə masası; ~ **surgeon** cərrah; **2.** cari; ~ **costs** cari xərclər; istismar xərcləri; **3.** xidməti; ~ **personnel** xidməti personal

**operation** [.ɔpə'reıʃn] *n* **1.** fəaliyyət, iş, işəsalma; əməliyyat, çalışma; **to conduct an ~** iş aparmaq; **to launch an ~** işə salmaq; *The operation of the pump is very simple Nasosun iş prinsipi çox sadədir;* **in ~** işlək halda; **in full ~** tam işlək halda; **secret ~** məxfi əməliyyat; **guerrilla ~s** partizan əməliyyatları; **joint ~s** birgə əməliyyatlar, birgə səylər; **large-scale ~s** irimiqyaslı əməliyyatlar; **mine-sweeping ~s** minaların zərərsizləşdirilməsi üzrə əməliyyatlar; **mopping-up ~s** tutulmuş ərazilərin düşməndən təmizlənməsi əməliyyatları; **rescue ~** xilasetmə əməliyyatı; **2.** proses; **the ~s of the mind** əqli proseslər, beyində gedən proseslər; **3.** təsir, səmərəlilik; **4.** *mal.* maliyyə əməliyyatı; maliyyə əməliyyatının həyata keçirilməsi; **5.** təcrübənin aparılması, sınağın keçirilməsi; **6.** *tib.* əməliyyat *(cərrahiyyədə)*; **stomach ~** mədədə cərrahiyyə əməliyyatı; **chest ~** döş qəfəsində cərrahiyyə əməliyyatı; **to perform an ~** cərrahiyyə əməliyyatı aparmaq; **to have / to undergo an ~** cərrahiyyə əməliyyatına məruz qalmaq; **exploratory ~** tibbi müayinə; **major ~** ciddi əməliyyat; **minor ~** sadə əməliyyat; **recurrent ~** təkrar əməliyyat; **transplant ~** insan orqanlarının transplantasiyası /köçürülməsi əməliyyatı; **an ~ for the removal of gallstones** öd kisəsinin daşlarının çıxarılması üzrə əməliyyat; *The operation was effective Əməliyyat müvəffəqiyyətlə keçdi;* **7.** *hərb.* *(adət pl.)* hərbi əməliyyatlar; **8.** *riyaz.* əməliyyat; **9.** istismar, işləmə; **10.** idarəetmə; *(mexanizmi, cihazı, müəssisəni və s.)*; *For some time electricity has been used for the operation of the machine Bir müddət dəzgahı idarə etmək üçün elektrik enerjisindən istifadə edilirdi*

**operational** [.ɔpə'reıʃənl] *adj* **1.** əməliyyat; əməliyyata aid; ~ **efficiency** əməliyyatın səmərəsi; ~ **flexibility** əməliyyatın elastikliyi; **2.** *hərb.* hərbi; operativ; hərbi hazırlıq vəziyyətində; ~ **orders** hərbi sərəncam və əmrlər; ~ **task** hərbi tapşırıq / məqsəd; ~ **formation** hərbi hissə; taktiki birlik; ~ **missile** hərbi raket; ~ **fatigue** hərbi yorğunluq; ~ **agency** hərbi vəsait; **3.** iş, işə aid; istismar, praktiki; ~ **ceiling** son iş həddi; ~ **data** iş göstəriciləri; ~ **costs** istismar xərcləri; **4.** əqli cəhətdən fəal *(uşaq)*; **5.** *riyaz.* əməliyyat, operatorlardan istifadə edən; **6.** *fəls.* operasionalistik, operasionalizmə aid

**operationally** [.ɔpə'reıʃnəlı] *adv* əməliyyat/istismar cəhətdən, əməliyyat/ istismar baxımından; ~ **available / ready** istismar cəhətdən hazır vəziyyətdə olan

**operative[1]** [.ɔpə'reıtıv] *n* **1.** fəhlə; operator, müdir, prorab; **2.** əqli işlə məşğul olan insan *(alim, tədqiqatçı, yazıçı və s.)*; mexanik; yüksək dərəcəli dəzgah ustası; **3.** xəfiyyə; gizli agent, casus; **4.** sənətkar, kustar

**operative[2]** [.ɔpə'reıtıv] *adj* **1.** işləyən, işlək vəziyyətdə olan; məşğul, fəal; *My car was still in an operative condition Mənim maşınım hələ də işlək vəziyyətdə idi;* **2.** səmərəli, effektiv, təsirli *(görülmüş tədbir, atılmış addım, qəbul edilmiş dərman haq.)*; *She was given an operative dose of the medicine Ona təsirli dozada dərman verdilər;* ~ **principle** siyasi təsirlilik prinsipi; **3.** vacib, məna kəsb edən; tutarlı, əsas məna daşıyan *(fikir, söz haq.)*; ~ **words** əsas/təsirli sözlər; **4.** tətbiqi, praktiki; fiziki *(iş, fəaliyyət və s. haq.)*; **5.** *tib.* cərrahiyyə; ~ **treatment** cərrahiyyə müdaxiləsi/ əməliyyatı

**operatize** ['ɔpərətaız] *v* hər hansı bir əsər əsasında opera bəstələmək; ~ **a comedy** komediya əsasında opera bəstələmək

**operator** ['ɔpəreıtə[r]] *n* **1.** operator; **computer ~** kompüter texniki; **crane ~** yük qaldıran kranın operatoru; **elevator / lift ~** liftçi; **ham ~** radist, radiostansiya operatoru; **lathe ~** tokar, tornaçı; **radar ~** radiolokasiya qurğusunun operatoru; **radio ~** radist; radiooperator; **~'s position** operatorun iş yeri; **2.** mexanik, maşinist; **machine ~** maşinist, maşın operatoru, mexanik; **3.** sürücü; **4.** telefonçu, teleqrafçı; radist, rabitəçi; **switchboard / telephone ~** telefonçu, operator; **5.** *tib.* həkim-cərrah; diş həkimi; **6.** biznesmen; sahib; müdir; **big ~s** yüksək rütbəli / vəzifəli şəxslər; **7.** birja dəllalı; bacarıqlı / işgüzar adam; *He is what we call nowadays an 'operator', and completely unscrupulous and unashamed O, indiki zamanda "dəllal" adlandırılan adamlardandır, tamamilə prinsipsiz və insafsız;* **8.** *riyaz.* operator; **9.** *dilç.* operator; *Operators are forms like articles, prepositions, conjunctions which perform syntactic functions Operatorlar sintaktik funksiyalar yerinə yetirən artikl, sözönü, bağlayıcı tipli sözlərdir;* **10.** *biol.* gen-operator

**operetta** [.ɔpə'retə] *n* operetta

**ophidian[1]** [ɔ'fıdıən] *n* ilan

**ophidian[2]** [ɔ'fıdıən] *adj* **1.** sürünənlər sinfinə aid olan; **2.** ilanabənzər, ilanşəkilli, ilanaoxşar, ilanvarı

**ophiolatry** [.ɔfı'ɔlətrı] *n* ilanlara ibadətetmə

**ophiophagous** ['ɔfıəfeıgəs] *zool.* ilanyeyən

**ophthalmia** [ɔf'θælmıə] *n tib.* oftalmiya *(göz xəstəliyi)*

**ophthalmic** [ɔf'θælmık] *adj tib.* göz; ~ **glass** eynək şüşəsi; ~ **hospital** göz xəstəlikləri xəstəxanası

**ophthalmologist** [.ɔfθæl'mɔlədʒist] *n* oftalmoloq, göz həkimi

**ophthalmology** [.ɔfθæl'mɔlədʒı] *n* oftalmologiya, göz xəstəlikləri haqda elm

**ophthalmoscope** [ɔf'θælməskoup] *tib.* oftalmoskop

**ophthalmoscopy** [ɔf'θælməskɔpı] *tib.* oftalmoskopiya

**opiate**[1] ['oupıt] *n* **1.** yuxu gətirən, bihuşdarı, sakitləşdirici *(tərkibində opium olan dərman);* **2.** *məc.* yuxu, sakitlik gətirən hər hansı bir şey; tiryək *Religion is the opiate of the people Din xalqın tiryəkidir;* **3.** narkotik maddə, opiat; *Methadone itself is an addictive opiate Metadon özü-özlüyündə narkotik asılılıq yaradan maddədir*

**opiate**[2] ['oupıt] *adj* **1.** tərkibində opium olan, narkotik; sakitləşdirici, bihuşdarı *(dərman, tiryək haq.);* **2.** *məc.* yuxu və ya hərəkətsizliyə səbəb olan

**opiate**[3] ['oupıt] *v* **1.** yuxu gətirmək, bihuş etmək, *(opium, bihuşdarı və s. vasitəsi ilə);* **2.** zəiflətmək, kütləşdirmək *(diqqəti, hissi və s.);* **3.** opium qatmaq *(nəyəsə)*, opiumla zənginləşdirmək

**opine** [ou'paın] *v* fikir yürütmək, hesab / fərz etmək

**opinion** [ə'pınjən] *n* **1.** fikir, rəy, mülahizə, mövqe, zənn; **an ~ about / on *smth.*** bir şey haqda fikir/rəy; **to act up to *one's* ~s** əqidəsinə/mülahizəsinə görə hərəkət etmək; **to air/to express / to give / to offer / to pass / to state / to venture an ~** fikir bildirmək/söyləmək; *I still have not formed an opinion about the candidates Mən hələ namizədlər barədə rəyimi müəyyənləşdirməmişəm;* **to entertain / to have / to hold an ~** rəyi / fikri olmaq; **to have a high ~ of** yaxşı / yüksək fikirdə olmaq; *He has a high opinion of himself O özündən bədgümandır , O özü haqqında yüksək fikirdədir;* **to have a low ~ of** pis fikirdə olmaq; **to have no settled ~s** müəyyən mövqeyi olmamaq; **to have no ~ of** heç bir mövqeyi, rəyi olmamaq; **to hand down an ~** rəsmi mövqe elan etmək; *The court handed down an opinion Məhkəmə fikrini elan etdi;* **to mould public ~** ictimai rəyi formalaşdırmaq; **in my ~** fikrimcə, məncə, mənə görə; **to form an ~ about *smth.*** bir şey haqda fikir formalaşdırmaq/yaratmaq; **2.** qiymət; mütəxəssisin rəyi; **expert ~** mütəxəssisin rəyi; **lay ~** mütəxəssis olmayan şəxsin rəyi;

◊ *Opinions differ ≅ Zövqlər müxtəlif olur*

**opium**[1] ['oupjəm] *n* anaşa, tiryək

**opium**[2] ['oupjəm] *adj* tiryək, anaşa; **~ den** tiryəkxana

**oppidan**[1] ['ɔpıdn] *n* **1.** şəhərli, şəhər sakini; **2.** İton kollecinin kirayədə yaşayan tələbəsi

**oppidan**[2] ['ɔpıdn] *adj* **1.** şəhər; **2.** universitetə aid olan

**oppilate** [əpı'leıt] *tib.* tıxac yaratmaq, qarşısını kəsmək

**oppilation** [əpı'leıʃn] *tib.* qəbizlik

**opponent**[1] [ə'pounənt] *n* **1.** əleyhdar, rəqib, opponent *(mübahisə, diskussiya və s. zamanı);* **2.** *id.* qarşı tərəf, rəqib; **3.** müqabil tərəf *(seçki və s.);* **4.** *hüq.* əks tərəf; **formidable / strong ~** güclü / ciddi rəqib; **weak ~** zəif rəqib; **fair ~** ləyaqətli rəqib; **intelligent / rational ~** ağıllı rəqib; *My worthy opponent Mənim hörmətli opponentim*

**opponent**[2] [ə'pounənt] *adj* **1.** əks; qarşı tərəfdə yerləşən, üzbəüz; **~ poles** əks qütblər; **~ riverbank** çayın o biri sahili; **2.** tam əks *(fikir, rəy və s.);* bir şeyə qarşı qoyulmuş; **3.** düşmən, əks mövqedə olan; **4.** rəqib, opponent

**opportune** ['ɔpətju:n] *adj* vaxtlı-vaxtında olan, əlverişli; müvafiq, yerinə düşən; **~ moment** uyğun / müvafiq an; **~ remedies** müvafiq dərmanlar; **~ rain** vaxtlı-vaxtında yağan yaxış; **~ offer of assistance** vaxtında edilmiş yardım təklifi

**opportunely** ['ɔpətju:nlı] *adv* vaxtlı-vaxtında, əlverişli tərzdə

**opportuneness** ['ɔpətju:nnıs] *n* əlverişlilik, münasiblik, müvafiqlik

**opportunism** ['ɔpətju:nızm] *n siya.* opportunizm

**opportunist** ['ɔpətju:nıst] *n siya.* opportunist

**opportunistic** [.ɔpətju:'nıstık] *adj siya.* opportunistik

**opportunity** [.ɔpə'tju:nıtı] *n* imkan; fürsət; **to afford / to give / to offer an ~** imkan yaratmaq; **to find an ~** imkan tapmaq, imkan əldə etmək; **to have an ~** imkanı olmaq; **fleeting ~** əldən çıxan fürsət; **lost/missed ~** əldən çıxmış/itirilmiş fürsət; **to grab/to seize/to take an ~** imkandan istifadə etmək; **to lose an ~** imkanı/fürsəti əldən vermək/buraxmaq; **to take the ~ of** imkandan, fürsətdən istifadə etmək

**oppose** [ə'pouz] *v* **1.** üzbəüz qoymaq / yerləşdirmək; **2.** bir-birinə qarşı qoymaq, üzləşdirmək; əks nümunə kimi gətirmək; **3.** müqayisə etmək, qarşılaşdırmaq; **4.** başqa fikirdə / müxalifətdə olmaq; əleyhinə çıxış etmək; **5.** üzə durmaq, əksinə getmək; inkar / rədd etmək; müqavimət göstərmək; **to ~ resolutely / strongly / vehemently** qəti / güclü /şiddətli müqavimət göstərmək; *The world does not oppose religion as such Dünya elə də dinin əksinə deyildir*

**opposed** [ə'pouzd] *adj* **1.** **(to)** əks, zidd; **diametrically ~** diametral şəkildə əks/zidd; **strongly/ vehemently ~** kəskin şəkildə əks; **2.** müqavimətlə üzləşən; **~ landing** *dən.* desantın döyüşlə sahilə çıxması

**opposing** [ə'pouzıŋ] *adj* **1.** müqavimət göstərən **2.** əks, əks olan; **~ views** əks fikirlər / rəylər

**opposite**[1] ['ɔpəzıt] *adj* **1.** üzbəüz yerləşən / olan, **2.** əks; **~ poles** *fiz.* əks qütblər

**opposite**[2] ['ɔpəzıt] *n* **1.** əkslik; zidlik; **direct ~** tam zidlik/əkslik; **2.** *dilç.* antonim; **3.** *riyaz.* inversiya

**opposite**[3] ['ɔpəzıt] *adv* əksinə; üzbəüz; **the building ~** üzbəüz bina

**opposite**[4] ['ɔpəzıt] *prep* qarşısında, qarşı-qarşıya, əks, üzbəüz; **to sit ~ each other** bir-biri ilə üzbəüz /qarşı-qarşıya oturmaq

**opposition** [.ɔpə'zıʃn] *n* **1.** müqavimət; düşmənçilik; **against/ despite/in spite of/over** *(***the***)* **~**



müqavimətə baxmayaraq; **to arouse / to stir up ~** düşmənçilik/qərəzlik yaratmaq; **to offer/to put up ~** müqavimət göstərmək; **to crush/to overcome ~** müqaviməti qırmaq; **to come across/to meet / to run up against ~** müqavimətə rast gəlmək, müqavimətlə qarşılaşmaq / rastlaşmaq; **to neutralize an ~** müqaviməti aradan qaldırmaq; **determined/fierce/stiff/strong / unbending/unyielding/vehement ~** qəti/ kəskin/sərt/güclü/sarsılmaz/möhkəm/şiddətli müqavimət; **~ to new taxes** yeni vergilərə qarşı müqavimət; **2.** qarşıdurma, ziddiyyət, əkslik, kontrast; **in ~ to** bir şeyin əksinə olaraq; **3.** *dilç.* əkslik *(fonoloji, semantik)* **4.** *mənt.* təzad, əks fikir; **5.** *astr.* qarşı durma *(planetlərin göydə günəşin əks tərəfindəki nöqtədə durması)* **6.** müxalifət, müxalif tərəf *(İngiltərədə);* **to be in ~** müxalifətdə olmaq, müxalifəti təmsil etmək; **~ benches** İngiltərə Parlamentində müxalifətin oturduğu kürsülər; **to gain ~ cheer** müxalifətin razılığını almaq

**oppositionist** [.ɔpə'zıʃnıst] *n* müxalifətçi

**oppress** [ə'pres] *v* **1.** zülm etmək, əsarət altına almaq, əzmək, sıxışdırmaq; **2.** mənəvi cəhətdən üzmək, üzücü təsir göstərmək; **3.** *məc.* hücum çəkmək, qalib gəlmək, aparmaq *(yuxu, yorğunluq və s. haq.)*

**oppressed** [ə'presd] *adj* əzilmiş, haqqı taptalanmış

**oppression** [ə'preʃn] *n* **1.** zülm, əsarət, əzmə; **2.** zülm altında olma, əzginlik; ruh düşkünlüyü

**oppressive** [ə'presıv] *adj* **1.** zülmkar, qəddar, despot, insanları əzən; **~ legislation** qəddar qanunlar; **~ domination** despotizm, qatı zülm; **2.** üzücü, ağır; **~ weather** üzücü / boğanaq / bürkülü hava

**oppressiveness** [ə'presıvnıs] *n* **1.** qəddarlıq, zülmkarlıq; **2.** *məc.* üzücü/ağır ab-hava/mühit

**oppressor** [ə'presəʳ] *n* **1.** zülmkar, qəddar insan; **2.** üzücü/ağır olan bir şey

**opprobrious** [ə'proubrıəs] *adj* **1.** təhqiredici, təhqiramiz *(söz, danışıq və s. haq.);* **~ language** söyüş; **2.** biabır/rüsvay edən

**opprobrium** [ə'proubrıəm] *n* biabırçılıq, həqarət, təhqir, ləyaqətsizlik

**oppugn** [ɔ'pju:n] *v* **1.** *məc.* hücum etmək; mübarizə aparmaq; suala tutmaq; **2.** qarşı çıxmaq; təkzib/ mübaliğə etmək; **3.** plana/fikrə qarşı çıxmaq

**opt** [ɔpt] *v* *(***for; between***)* seçmək, üstünlük vermək; **to ~ for a particular candidate** namizədlərdən birinə xüsusi üstünlük vermək, namizədlərdən birini seçmək; *The two boys opted for the Navy Hər iki gənc dəniz donanmasını seçdi;* **to ~ out** iştirak etməmək; kənarda qalmaq, boyun qaçırmaq; **to ~ out of society** dərviş olmaq, cəmiyyətdən uzaqlaşmaq; **to ~ in** iştirak etmək

**optative**[1] ['ɔptətıv] *n qram.* optativ, felin optativ/arzu forması

**optative**[2] ['ɔptətıv] *adj* optativ, arzu; **~ mood** *qram.* optativ, felin optativ/arzu forması/şəkli

**optic**[1] ['ɔptık] *n* **1.** göz; **2.** optik alət

**optic**[2] ['ɔptık] *adj* **1.** göz, görmə; **~ nerve** görmə siniri; **~ angle** görmə bucağı; **2.** işıq, optik; **~ amplifier** optik gücləndirici; **~ block** optik sistem

**optical** ['ɔptıkl] *adj* **1.** görmə, optik; **~ illusion** optik aldanma; **~ disc** stroboskop; **2.** görünən; **~ galaxy** görünən qalaktika

**optically** ['ɔptıkəlı] *adv* optiki cəhətdən; **~ active crystal** optiki cəhətdən fəal kristal; **~ active form** optiki cəhətdən fəal forma

**optician** [ɔp'tıʃn] *n* optik; görməyə düzəliş verən mütəxəssis *(kontakt linzaları, eynək və s. seçən)*

**optics** ['ɔptıks] *n* optika; **electron ~** elektron optikası; **fiber ~** lif optikası ; **geometrical ~** həndəsi optika; **physical ~** fiziki optika; **wave ~** dalğa optikası

**optimal** ['ɔptıml] *adj* optimal; ən uyğun/müvafiq; **~ choice** optimal/ən uyğun seçim; **~ decision** optimal/ ən uyğun qərar; **~ design** optimal / ən uyğun layihələşdirmə; **~ policy** optimal/ən uyğun siyasət

**optimality** [.ɔptı'mælıtı] *n* optimallıq; **continuous ~** *riyaz.* mütəmadi/davamlı optimallıq

**optimism** ['ɔptımızm] *n* *(***about, over***)* optimizm, nikbinlik; **to display / to show ~** optimizm/nikbinlik nümayiş etdirmək; **to express ~** optimizm/nikbinlik ifadə etmək; **incurable/unflagging ~** sonsuz optimizm/nikbinlik

**optimist** ['ɔptımıst] *n* optimist/nikbin adam **incurable ~** daim optimist/nikbin olan adam

**optimistic** [.ɔptı'mıstık] *adj* **1.** **(about, over)** optimist, nikbin; **incurably ~** həmişə optimist/nikbin əhval-ruhiyyədə olan; *We are optimistic that the results will be favourable Biz əminik ki, nəticələr əlverişli olacaq;* **2.** özündən razı, özünə arxayın

**optimistical** [.ɔptı'mıstıkl] *adj* = **optimistic**

**optimization** [.ɔptımaı'zeıʃn] *n* optimallaşdırma; **multi-objective ~** çoxamilli optimallaşdırma

**optimize** [.ɔptı'maız] *v* optimallaşdırmaq

**optimum**[1] ['ɔptıməm] *n* *(pl* **-tima, -s***)* maksimallıq, ən əlverişli şərait; **to have an ~ effect** maksimal səmərə götürmək

**optimum**[2] ['ɔptıməm] *adj* optimal; əlverişli; *The government asked people to move to regions in which optimal conditions for farming can be created Hökumət fermer təsərrüfatlarının inkişafı üçün ən optimal şərait yaradıla biləcək regionlara köçməyi adamlara tövsiyyə etdi*

**opt-in** ['ɔptın] v iştirak etmək

**option**[1] ['ɔpʃn] *n* **1.** seçim, alternativ, variant, imkan; **soft ~** asan seçim; *She took a soft option O ən asan yol seçdi; I have no option (open) Mənim başqa yolum /seçimim yoxdur;* **exclusive ~** xüsusi seçim; *They had an option to buy the team On-*

*ların komandanı almağa imkanı var idi; I took up my option Mən öz imkanımdan istifadə etdim;* **to keep smb's ~s open** bir kəsin seçim hüququnu özündə saxlamaq; **at/in** ~ öz fikrinə/ seçiminə/ istəyinə görə; **2.** bir kəsin seçim haqqı / azadlığı; **with/ without the** ~ *(of a fine)* cəriməni ödəmək və ya ödəməmək haqqı ilə; *They were given the option of a fine Onlara cərimənі ödəmək haqqı verildi;* **3.** *iqt.* opsion; **4.** *id.* qapını seçmək və ya oyunçunu dəyişmək hüququ

**option[2]** [ˈɔpʃn] *v* almaq, satmaq *(lisenziya, müəllif hüququ və s.); I optioned the land around the company for future expansion. Mən, gələcəkdə şirkəti genişləndirmək üçün ona bitişik torpaq sahəsini aldım; She has written a first novel and had it optioned for films O, ilk romanını yazdı və onun ekranlaşdırılması hüququnu satdı*

**optional** [ˈɔpʃənl] *adj* ixtiyari, könüllü; fakultativ; ~ **subject** fakultativ fənn; ~ **contributions** könüllü ianə

**optionality** [ˌɔpʃəˈnælıtı] *n* ixtiyarlılıq, könüllülük

**optionally** [ˈɔpʃənəlı] *adv* ixtiyari, könüllü

**opt-out** [ˈɔptaut] *n* iştirak etməmə, boyun qaçırma; **an ~ from the treaty** müqavilədən boyun qaçırma

**opt-out** [ˈɔptaut] *v* iştirak etməmək, boyun qaçırmaq; **to ~ from the treaty** müqavilədən boyun qaçırmaq

**opulence** [ˈɔpjuləns] *n* **1.** bolluq, var-dövlət; **2.** çoxluq, artıqlıq *(normadan artıq qüvvə, ehtiyat və s.)*

**opulent** [ˈɔpjulənt] *adj* **1.** varlı, imkanlı, zəngin; ~ **villas** zəngin villalar; *He hoped to marry an opulent widow O, varlı dul qadınla evlənməyə ümid edirdi;* **to live in ~ comfort** zənginlik içərisində / bəy kimi yaşamaq; **2.** gəlirli, mədaxil gətirən; **3.** *məc.* iri, geniş *(fiziki cəhətdən: insan haq.);* yetənəkli, ağıllı, istedadlı; **4.** sıx, çoxlu, qalın, keçilməz *(bitkilər, güllər haq.);* **5.** rəngarəng; iyli, qoxulu *(gül)* **6.** al-əlvan, güllü, rəngbərəng, rəngarəng; bəzənmiş *(metaforalarla – üslub, əsərin dili, qafiyəsi və s. haq.)*

**opus** [ˈoupəs] *n* əsər *(xüs. musiqi əsəri; çox zaman mənfi mənada)* ~ **magnum** görkəmli əsər *(adət. ədəbi, musiqi);* **Beethoven's ~ 112** Bethovenin 112-ci əsəri

**opuscule** [ɔˈpʌskju:l] *n* kiçik əsər *(xüs. musiqi və ya ədəbi əsər)*

**or[1]** [ɔ:ʳ] *conj* ya, yaxud, və ya, və yaxud, yoxsa; *Make haste or else you will be late Tələs/Tələsin, yoxsa gecikəcəksən/gecikəcəksiniz; Is the baby a boy or a girl? Uşaq oğlandır, yoxsa qız?;* ~ **so** təxminən, buna bənzər bir şey; ~ **else** ya, əks təqdirdə, yoxsa; **either...~** ya ... ya da...

**-or[2]** [-ə] *suff* **1.** *Əsasən Roman mənşəli isimlərdə təsadüf olunur və aşağıdakı mənaları ifadə edir:* **1)** *Hərəkətin icraçısını bildirir:* inventor ixtiraçı, creator yaradıcı, translator tərcüməçi; **2)** *Sənət/ peşə bildirir;* sailor dənizçi; tailor dərzi; **3)** *Hərəkət alətinə işarə edir:* refrigerator soyuducu, tractor traktor; **2.** *Az miqdar sifətlərdə təsadüf edilir:* major böyük, nisbətən vacib; minor balaca, kiçik, xırda, cüzi, əhəmiyyətsiz

**orach** [ˈɔrıtʃ] *n bot.* sirkan

**oracle[1]** [ˈɔrəkl] *n* **1.** məbəd, ilahi yer, ibadətgah *(qədim Roma və Yunanıstanda);* **2.** falçı; **3.** peyğəmbərlik; **4.** fal, proqnoz, qabaqcadan deyilən məlumat; ~ **bones** *qədim Çində fala baxmaq üçün istifadə olunan sümüklər;* **5.** mömin, Allah adamı, molla, medium; **6.** *kils.* yəhudi kilsəsində ən müqəddəs yer; **7.** müqəddəs yazı/kitab; **8.** *kils.* mənəvi müəllim, tərbiyəçi; **9.** *məc.* əsl həqiqət, danılmaz həqiqət; **10.** çox vacib və ya çox müdrik kəlam/ cavab; **11.** *məc.* tanınmış adam, korifey, sözu böyük çəkiyə malik insan; **12.** *məc.* yolgöstərən, vəfalı yoldaş *(adətən kompas və saatlar haq.); This watch is my only oracle Bu saat mənim yeganə sadiq yoldaşımdır;*

◊ **to work the ~ 1)** *məc.* əlaqələrdən/ imkanlardan istifadə etmək; **2)** *d.d.* varlanmaq, pul tapmaq/əldə etmək

**oracle[2]** [ˈɔrəkl] *v məc.* peyğəmbərlik etmək, qabaqcadan söyləmək, fal açmaq

**oracular** [ɔˈrækjuləʳ] *adj* **1.** çin, qabaqcadan deyilən; **2.** müdrik, hər şeyi bilən, peyğəmbərcəsinə doğru *(kəlam və ya insan haq.); He opened his lips. with an oracular shake of the head Başını peyğəmbərcəsinə silkələyərək o, dilə gəldi/danışdı;* **3.** sehrli; qəribə, naməlum, ikimənalı

**oral[1]** [ˈɔ:rl] *n* **1.** şifahi imtahan; **2.** *fon.* ağız səsi

**oral[2]** [ˈɔ:rl] *adj* **1.** şifahi *(imtahan, tərcümə və s.);* **an ~ examination** şifahi imtahan; ~ **exercises** şifahi tapşırıqlar; ~ **evidence** şifahi ifadə vermə / şahidlik; ~ **Law** Yazılmamış Qanun *(yəhudilərdə);* **2.** dodaq, artikulyativ; ~ **school** lal-karlar üçün məktəb; ~ **instruction/method** dodaq üsulu *(lal-karlara təlim keçmək üçün)* **3.** *anat.* ağız, oral; ~ **cavity 1)** ağız boşluğu/nahiyəsi; **2)** *xortumlu həşəratların xortumu yerləşən nahiyə;* **3.** daxili; daxilə qəbul edilməli *(dərman və s.);* **4.** *fon.* ağız, küylü

**orally** [ˈɔ:rəlı] *adv* **1.** şifahi, sözlə; **2.** *tib.* daxilə qəbul etməklə *(dərman);* **3.** eşitmə vasitəsi ilə

**orang-utan** *(həm də* **orang-outang***)* [ˈɔ:rəŋˈu:tæn] *n zool.* oranqutanq *(insanabənzər meymun cinsi)*

**orange[1]** [ˈɔrındʒ] *n* **1.** portağal *(meyvə);* **2.** portağal ağacı; **blood ~** xurma və portağal növü; **clove/noble/mandarin ~** mandarin; **to squeeze an ~** portağalın suyunu sıxmaq; **3.** portağal şirəsi; **4.** narıncı rəng, portağal rəngi;

◊ **a squeezed ~** *məc.* "suyu sıxılmış limon", lazımsız adam

**orange[2]** [ˈɔrındʒ] *adj* **1.** portağal; ~ **juice** portağal şirəsi; ~ **-quarter** portağal dilimi; ~ **stick** portağal ağacından düzəldilmiş taxta parçası *(manikürdə istifadə edilir);* **2.** narıncı, portağal rəngi, narıncı rəngli; ~ **ribbon** narıncı rəngli lent;

◊ ~ **book** Əkinçilik Nazirliyinin hesabatı *(narıncı cildli);* ~ **team** Hollandiya milli futbol yığma komandasının qeyri-rəsmi adı *(təxminən XX əsrin 60-cı illərindən bəri)*

**orangery** [ˈɔrındʒərı] *n* **1.** portağal bağı; **2.** oranjereya *(portağal ağaclarını yetişdirmək üçün);* **3.** portağal komponenti *(ətirlərə əlavə edilir)*

**orangey** [ˈɔrındʒı] *adj* açıq narıncı rəngli

**orate** [ɔ:ˈreıt] *v zaraf.* nitq söyləmək, natiqlik/ demaqoqluq etmək

**oration** [ɔ:ˈreıʃn] *n* **1.** dua, Allaha xitab; **2.** nitq *(xüs. təntənəli);* **to deliver an ~** təntənəli nitq söyləmək; **funeral ~** dəfn mərasimində nitq; **direct ~** vasitəsiz nitq; **indirect ~** vasitəli nitq

**orator** [ɔ:ˈreıtəʳ] *n* natiq; *He is no orator O, yaxşı natiq deyil;* **eloquent ~** mahir/fəsahətli natiq; *The vulgar are always unwilling to believe that a great orator can be a profound thinker Qara camaat heç zaman inanmaq istəmir ki, görkəmli natiq həm də dərin mütəfəkkir ola bilər;* **Public ~** *universitetin təntənəli mərasimlərdə çıxış edən rəsmi təmsilcisi (Kembric və Oksford universitetlərində);* **park-bench ~** tanış kütlə qarşısında siyasət haqda nüfuzlu, lakin əsassız danışmağı sevən adam

**oratorical** [ˌɔrəˈtɔrıkl] *adj* **1.** natiqlik; ~ **ability** natiqlik qabiliyyəti; ~ **contest** natiqlik ustalığı üzrə yarış; **2.** fəsahətli; **eloquent ~** fəsahətli /bəlağətli çıxış;

**oratorio** [ˌɔrəˈtɔ:rıou] *n mus.* oratoriya

**oratory** [ˈɔrətərı] **I** *n* **1.** ritorika; fəsahət; natiqlik sənəti; **2.** nitq; **campaign ~** seçkiqabağı nitq/ ritorika *(seçkiqabağı kampaniya zamanı verilən vədlər və irəli sürülən ittihamlar);* **inflammatory/mob /rabble-rousing ~** qızışdırıcı/ilhamverici nitq

**orb[1]** [ɔ:b] *n* **1.** kürə; şar; sfera; **2.** göy cismi; **3.** *şair.* göz almacığı; göz; **4.** *Rusiyada çarın hakimiyyət emblemi olan üstü xaçlı qızıl şar;* **5.** *mem.* qapalı arkada/tağ sırası; alaqapı pəncərəsi

**orb[2]** [ɔ:b] *v şair.* **1.** kürə və ya çəmbər şəklinə salmaq, yumrulamaq; **2.** halqaya/dairəyə almaq; **3.** orbitdə fırlanmaq/dairə vurmaq

**orbed** [ɔ:bd] *adj* yumrulanmış; yumru formada olan, sferik; şarabənzər, kürəyəbənzər

**orbicular** [ɔ:bıkjuləʳ] *adj* **1.** yumru, dəyirmi, sferik, şarşəkilli; ~ **muscle** çəmbərvari əzələ; **2.** tam, bitmiş, tamamlanmış

**orbit[1]** [ˈɔ:bıt] *n* **1.** *anat.* göz çuxuru; göz pərdəsi *(quşlarda, həşəratlarda və s.);* göz, göz alması; **2.** orbit *(göy cisminin, süni peykin və s.);* **the Earth's ~ round the Sun** Yerin Günəş ətrafında orbiti; **to put a satellite into ~** süni peyki orbitə çıxarmaq; **to put/ to place in ~** orbitə çıxarmaq/yerləşdirmək; **to go into ~** orbitə çıxmaq; **3.** *fiz.* orbit *(nüvə ətrafında hərəkət edən elektron);* **4.** *məc.* orbit, yol, məslək *(bir şeyin sərbəst hərəkəti; bir şeyin vurduğu sabit dairə);* **5.** *orbitdə hərəkət etmə və ya orbitdə olma vəziyyəti; Recovery from orbit has never been accomplished by us or Russia Orbitdən qayıtdıqdan sonra orqanizmin tam bərpasına nə biz, nə də Rusiya nail ola bilməmişdir*

**orbit[2]** [ˈɔ:bıt] *v* **1.** dairə üzrə hərəkət etmək, fırlanmaq; *We had been orbiting in our helicopter for about forty-five minutes Biz artıq qırx beş dəqiqə idi ki, vertolyotumuzla dairə vururduq;* **2.** orbit ilə hərəkət etmək/fırlanmaq/dövrə vurmaq; *The satellite orbited the Earth several times Peyk Yer kürəsinin orbiti üzrə bir neçə dəfə dövrə vurdu;* **3.** orbitə çıxmaq *(kosmik aparat haq.); The spaceship orbited successfully Kosmik gəmi müvəffəqiyyətlə orbitə çıxdı;* **4.** orbitə çıxarmaq/göndərmək *(peyki, kosmik gəmini və s.);*

◊ **to abort from ~** orbitini tərk etmək, orbitdən çıxmaq/yayınmaq; **at injection into ~** orbitə çıxma anında; **coordination of an ~** orbitin ilkin koordinatı / nöqtəsi; **inclination of the ~** orbitdən yayınma; **to inject into ~** orbitə çıxarmaq; **partially complex ~** bəzi hissələri mürəkkəb olan orbit; **to put / to boost / to lift / to launch into ~** orbitə yerləşdirmək; **relatively compact ~** nisbətən yığcam orbit

**orbital** [ˈɔ:bıtl] *adj* **1.** orbital, orbitlə hərəkət edən; ~ **station** orbital stansiya; ~ **transfer** bir orbitdən digərinə keçid; ~ **flight** orbital uçuş; ~ **revolution** *riyaz.* orbitlə hərəkət; ~ **velocity** birinci kosmik sürət; **2.** *anat., zool.* göz

**orchard** [ˈɔ:tʃəd] *n* meyvə bağı; **apple ~** alma bağı; **cherry ~** vişnə / albalı bağı; **peach ~** şaftalı bağı

**orchardman** [ˈɔ:tʃədmən] *n (pl* **–men** [men] bağban, meyvəçi, meyvəçilik mütəxəssisi

**orchestra** [ˈɔ:kıstrə] *n* **1.** orkestr *(qədim Yunanıstan teatrında xorun yeri);* **2.** qabaq yerlər, parter *(teatr və digər zallarda);* ~ **chair/stall** səhnənin/orkestrin yaxınlığında olan oturacaq/yer; **3.** orkestr və ya xorun səhnədəki yeri; **4.** orkestr *(adətən simfonik);* **to conduct / to direct / to lead an ~** orkestrə dirijorluq etmək; **chamber ~** kamera orkestri; **dance/pops ~** estrada orkestri; **symphony / philharmonic ~** simfonik orkestr; **string ~** simli orkestr; ~ **pit** orkestr çuxuru *(operada)*

**orchestrate** [ˈɔ:kıstreıt] *v* **1.** instrumentallaşdırmaq, orkestr üçün uyğunlaşdırmaq; **2.** *məc.* ahəngdar şəkildə uyğun olmaq

**orchestration** [ˈɔ:kıstreıʃn] *n* **1.** instrumentallaşdırma, orkestr üçün uyğunlaşdırma/işləmə; **2.** *məc.* ahəngdar şəkildə uyğun olma

**orchestric** [ɔ:ˈkestrık] *adj* rəqs; ~ **melody** rəqs musiqisi, oyun havası

**orchestrics** [ɔ:'kestrıks] *n* rəqs sənəti
**orchid** ['ɔ:kıd] *n bot.* səhləb çiçəyi
**orchil** ['ɔ:tʃıl] *n* orsel *(çəhrayı qırmızı rəngli boya)*
**orchis** ['ɔ:kıs] *n bot.* səhləb *(ot, bitki)*
**orchitis** ['ɔ:kıtıs] *tib.* orxit, yumurtalıqların iltihabı
**orchotomy** [ˌɔ:kə'tɔmı] *tib.* yumurtalıqların kəsilib atılması; axtalama, burma
**ordain** [ɔ:'deın] *v* **1.** dini rütbə vermək; **2.** qabaqcadan müəyyən etmək; əmr etmək; təyin etmək; hazırlamaq; *The emperor ordained that all foreigners be expelled İmperator bütün əcnəbilərin qovulmasına / qovulması üçün əmr verdi*
**ordeal** [ɔ:'di:l] *n* **1.** ağır/işgəncəli sınaq; **to undergo an ~** ağır sınaqdan keçmək; **terrible/trying ~** dəhşətli sınaq; **~ by fire** od ilə sınaq; **~ by water** su ilə sınaq **2.** *tar.* Allahın məhkəməsi, axirət günü
**order¹** ['ɔ:dəʳ] *n* **1.** nizam, müəyyən qaydada düzüm, sahman, növbə; **in ~** növbə/sıra ilə; **out of ~** növbəsiz, qaydasız, dağınıq; **numerical ~** nömrələrə görə düzülmə; **in numerical ~** nömrə qaydası ilə; **in alphabetical ~** əlifba sırası ilə; **in chronological ~** xronoloji qaydada, xronologiyaya/ qaydaya görə düzüm; **2.** saz vəziyyət, işlək durum; **good/shipshape ~** tam işlək / saz vəziyyət; **to get out of ~** xarab olmaq, sınmaq, işləməmək *(maşın, cihaz və s.)*; **to put in ~** qaydaya qoymaq, düzəltmək, təmir etmək; nizama salmaq; **in bad ~, out of ~** xarab/sınmış vəziyyətdə olma, işləməmə; **3.** yaxşı fiziki vəziyyət, sağlamlıq; **4.** intizam, sakitlik; *The chairman tried to maintain order Sədr sakitlik yaratmağa çalışdı;* **to call to ~** nizam-intizama çağırmaq; **to keep ~** intizama riayət etmək; **5.** qayda, prosedura *(iclasın, yığıncağın aparılması haq. və s.);* reqlament; nizamnamə; **to be in ~** gedişata görə qənaətbəxş olmaq; **6.** quruluş, dövlət quruluşu; **economic ~** iqtisadi quruluş; **pecking ~** qeyri-rəsmi iyerarxiya; müəyyən edilmiş tabeolma qaydası; **social ~** ictimai qayda/quruluş; **7.** *hərb.* sıra, düzülüş, hərbi düzüm; **8.** cəmiyyət təbəqəsi; sosial qrup; **9.** əmr, göstəriş, sərəncam; komanda; **by *smb.*'s ~** bir kəsin əmri ilə; **under the ~ of...** əmr altında; **to give / to hand down/ to issue an ~** əmr / sərəncam vermək; **to carry out / to execute an ~** əmri / sərəncamı yerinə yetirmək; **to obey / to follow ~** əmrə / sərəncama tabe olmaq; **to cancel / to countermand / to rescind / to revoke an ~** əmri / sərəncamı ləğv etmək; **to violate an ~** əmri/sərəncamı yerinə yetirməmək/pozmaq, əmrə əməl / riayət etməmək; **direct ~** birbaşa əmr; **written ~s** yazılı əmrlər / sərəncamlar; *We received an order to attack Biz hücum əmri aldıq; Headquarters issued an order that the attack be (should be) resumed. Qərargah yenidən hücum etmək əmri verdi;* **10.** sifariş; *(restoranda verilən);* **to give/to place/to put in an ~** bir şey sifariş etmək; **to make out/to write out an ~** sifariş etmək; **to fill an ~** sifarişi yerinə yetirmək; **to take an ~** sifarişi qəbul etmək; *Has the waiter taken your order? Ofisiant sənin/sizin sifarişini/sifarişinizi qəbul etdimi?;* **to cancel an ~** sifarişi ləğv etmək; **rush ~** təcili sifariş; **formal ~** rəsmi sifariş; **to be fully engaged with ~s** çoxlu sifarişi olmaq; **against ~** sifarişə əsasən; **against our ~ No. 1015** bizim 1015 nömrəli sifarişimizə əsasən; **made to ~** sifarişə əsasən düzəldilmiş; **11.** fərqlənmə nişanı, orden; cəngavər ordeni; **cloistered/monastic ~** rahib ordeni; **Masonic ~** Masson ordeni; **secret ~** gizli orden *(təşkilat)*; **12.** *kils.* dini rütbə; **to be in ~s** dini rütbəli şəxs olmaq; **to take ~s** dini şəxs olmaq;
◊ **a tall/large ~** çətin məsələ, çətin iş; **of the ~ of** təqribən; **in short ~** tez, cəld, ani, o saat; **to be under ~s** təyinatı gözləmək
**order²** ['ɔ:dəʳ] *v* **1.** müəyyən qaydada düzmək / nizamlamaq; **2.** qaydaya / nizama salmaq; işə salmaq; **3.** əmr etmək; sərəncam vermək; tapşırmaq; *She ordered the dog to sit Qız itə oturmağı əmr etdi;* **4.** yollamaq, göndərmək *(xaricə və s.)*; **5.** sifariş etmək *(paltar, nahar və s.); Let's order dessert when the waitress comes back Gəlin xidmətçi geri qayıdanda desert sifariş edək;* **6.** dərman yazmaq; **7.** dini rütbə vermək; **8.** qabaqcadan müəyyən etmək;
◊ **to ~ about** sıxışdırmaq, incitmək; üstündə ağalıq etmək, nökər kimi işlətmək; istədiyi kimi rəftar etmək
**ordering** ['ɔ:dərıŋ] *n* **1.** sifariş vermə / etmə; **2.** nizamlama; **3.** qayda, düzüm
**orderliness** ['ɔ:dəlınıs] *n* **1.** dəqiqlik, mütəmadilik; intizam, qayda, dözümlülük; **2.** qanuna tabe olma
**orderly¹** ['ɔ:dəlı] *n* **1.** *hərb.* növbətçi; qasid, rabitəçi; *An orderly came in haste to bring him news of the battle Qasid təngnəfəs gələrək ona döyüş sahəsində olan vəziyyəti çatdırdı;* **2.** *hərb.* sanitar; **3.** süpürgəçi *(küçədə)*; **4.** qayda-qanunun tərəfdarı / tərəfkeşi
**orderly²** ['ɔ:dəlı] *adj* **1.** təmiz, səliqəli; **an ~ room** təmiz / səliqəli otaq; **to keep an ~ desk** təmiz stol saxlamaq; **2.** sistematik, nizamlı, yaxşı təşkil olunmuş; dəqiq, düzgün; mütəmadi; mütəşəkkil; **~' march** mütəşəkkil marş; **~ rows of houses** evlərin sistematik cərgəsi; **an ~ mind** ardıcıllıqla fərqlənən ağıl; **~ universe** nizamlı kainat; **3.** sakit, intizamlı, sülh; **~ child** sakit/intizamlı uşaq; **~ demonstration** sülh nümayişi; **~ crowd** sakit / sülh əhval-ruhiyyəli kütlə
**ordinal¹** ['ɔ:dınəl] *n* sıra sayı
**ordinal²** ['ɔ:dınəl] *adj* **1.** sıra; **~ number** sıra



sayı; **2.** *biol.* dəstəyə/sinfə aid olan; **3.** dini rütbəyə aid olan; **4.** sıralardan ibarət olan
**ordinance** ['ɔ:dınəns] *n* **1.** fərman, sərəncam; dekret, əmr, göstəriş, qərar; **to adopt / to enact / to pass an ~** qərar qəbul etmək; **to issue an ~** fərman vermək; **to apply / to enforce / to obey / to observe an ~** qərarı/fərmanı/sərəncamı yerinə yetirmək; **to repeal/ to rescind / to revoke an ~** qərarı/ fərmanı/ sərəncamı ləğv etmək; **city/ municipal ~** bələdiyyə fərmanı/sərəncamı; **township ~** rayon üzrə fərman/sərəncam; *The town issued an ordinance that all dogs be/should be muzzled Şəhər bələdiyyəsi sərəncam verdi ki, bütün itlərə buruntaq taxılmalıdır;* **2.** ayin, mərasim, adət
**ordinarily** ['ɔ:dnərılı] *adv* adətən, adəti üzrə, bir qayda olaraq; *I have breakfast ordinarily at 8 o'clock Mən səhər yeməyimi adətən saat 8-də yeyirəm*
**ordinariness** ['ɔ:dnrınıs] *n* adilik; bəsitlik
**ordinary¹** ['ɔ:dnrı] *n* **1.** hazır xörək *(qabaqcadan hazırlanan)*; **2.** hazır xörək olan yeməkxana; **3.** *arx.* ümumi masası olan taverna; *In one of the narrow streets leading towards Cheapside she noticed a small inn or ordinary (J. Hawthorne) Çipsayda gedən dar küçələrdən birində o, kiçik mehmanxana və ya kiçik taverna gördü;* **4.** karvansara; **5.** adi, tanış olan bir şey; **6.** adi, normal səhhət; **7.** sadə adam, adi/heç nə ilə seçilməyən adam; **8.** *kils.* ibadət zamanı kilsədə oxunan mahnı; dua kitabı;
◊ **in ~** daimi; **out of the ~** qeyri-adi; **Surgeon in Ordinary to the King** saray həkimi; **professor in ~** ordinar/ştatlı professor
**ordinary²** ['ɔ:dnrı] *adj* **1.** adi, sadə, bəsit; gündəlik, eyni qaydada olan; **~ life** adi həyat; **~ habits** adi vərdişlər; **in an ~ way** adi qaydada; **2.** *hüq.* adi qaydada həyata keçirilən; **3.** orta, heç bir şeylə seçilməyən, hamıya məlum olan; *His books are very mean and ordinary Onun kitabları çox adi və orta səviyyədədir*
**ordination** [ˌɔ:dı'neıʃn] *n* **1.** yerləşmə, düzülüş, təsnifat; **2.** dini rütbə vermə; **3.** qabaqcadan müəyyən etmə *(xüs. Allah tərəfindən)*
**ordnance** ['ɔ:dnəns] *n* artilleriya qurğuları; **naval ~** dəniz artilleriyası; **~ survey 1)** bir ölkənin rəsmi xəritəsi; **2)** hərbi-topoqrafik çəkiliş; **~ Survey** kartoqrafiya idarəsi *(Britaniya və İrlandiyada)*; **~ Survey map** kartoqrafiya idarəsinin xəritəsi *(Britaniya və İrlandiyada)*
**ordure** ['ɔ:dʒuəʳ] *n* **1.** tullantı, zibil, çirk; çirkab, nəcis; peyin; **2.** əxlaqsızlıq, mənəvi pozğunluq; **3.** əxlaqsız sözlər, söyüş
**ore** [ɔ:ʳ] *n* **I 1.** filiz; **copper ~** mis filizi; **iron ~** dəmir filizi; **~ mining** dağ-mədən işi; **2.** *şair.* qiymətli metal
**ore** [ɔ:ʳ] *n* **II 1.** şan, şöhrət; **2.** xeyirxahlıq, mərhəmət
**orfe** [ɔ:f] *zool.* qızıl karp *(balıq)*
**organ** ['ɔ:gən] *n* **1.** *mus.* orqan; **to play the ~** orqan çalmaq; **American ~** fisqarmoniya *(nəfəsli, dodaqla çalınan musiqi aləti)*; **electronic ~** elektroorqan; **hand ~** şarmanka; **to grind / to play a hand ~** şarmanka çalmaq; **2.** orqan, üzv; **body ~s** bədən üzvləri; **major ~s** əsas bədən üzvləri; **sexual ~s** cinsi üzvlər; **sense ~s** hiss üzvləri; **~s of speech** nitq üzvləri; **3.** orqan, təşkilat, müəssisə; **official ~** rəsmi orqan; **governmental ~s** dövlət orqanları/ struk-turları; **4.** yazılı orqan, qəzet; **press ~** çap orqanı; **~s of public opinion** qəzetlər, radio, televiziya, kütləvi informasiya vasitələri, mediya
**organic** [ɔ:'gænik] *adj* **1.** instrumental, mexaniki; alət və ya qurğu kimi çıxış edən; **2.** orqanik, üzvi, həyati; həyati əhəmiyyət kəsb edən; orqanizmə aid olan; **~ disease** orqanik xəstəlik; **~ sensation** orqanizmin daxili prosesləri ilə əlaqədar olan hisslər və ya ağrı; **~ pulse** orqanik nəbz *(orqanik xəstəliklərin indikatoru kimi)*; **3.** üzvi, canlı; **~ nature** canlı təbiət; **~ remains** üzvi qalıqlar; **4.** ekoloji cəhətdən təmiz; sağlam **~ food** təbii/sağlam ərzaq; **5.** *kim.* üzvi; **~ chemistry** üzvi kimya; **~ analysis** üzvi analiz; **~ acid / base / compound / molecule** üzvi turşu / əsas / birləşmə / molekul ; **6.** anadangəlmə, təbii; əsas, ayrılmaz **7.** *hüq.* əsas, başlıca *(akt, qanun və s.)*; **~ law** əsas qanun, konstitusiya, ana yasa; **~ act** *yeni ərazi və ya ştatın yaranması haqda qanun/akt*; **8.** mütəşəkkil; sistemləşdirilmiş; struktural, quruluşa malik; *Thinking is not an isolated fact. It is the final step in an organic learning process Fikir təcrid olunmuş fakt deyil. O, mütəşəkkil dərketmə prosesində atılan sonuncu addımdır;* **9.** uzlaşdırılmış, koordinasiya edilmiş; qarşılıqlı asılılığı/əlaqəsi olan; *We were an organic whole Biz tam bir vahid idik;* **10.** *iqt.* təbii; **~ composition of capital** kapitalın təbii şəkildə yığılması/təmərküzləşməsi; **11.** orqan, orqan səsinə bənzər
**organism** ['ɔ:gənızm] *n* orqanizm, bədən, vücud; **dead ~** ölü orqanizm; **healthy ~** sağlam bədən/orqanizm; **living ~** canlı orqanizm; **minute ~s** mikroorqanizmlər
**organist** ['ɔ:gənıst] *n* **1.** orqançalan / orqançı; **2.** şarmankaçalan / şarmankaçı
**organization, -sation** [ˌɔ:gənaı'zeıʃn] *n* **1.** quruluş; orqanizm; **a few plants of low ~** bir neçə sadə strukturlu / quruluşlu bitki; **2.** təşkilat, struktur *(inzibati və funksional)*; **to establish / to form an ~** təşkilat yaratmaq; **to disband / to dissolve an ~** təşkilatı buraxmaq; **charitable /philanthropic ~** xeyriyyə təşkilatı; **nonprofit/not-for-profit ~** qeyri-kommersiya təşkilatı; **profit-making/proprietary ~** kommersiya təşkilatı; **state ~** dövlət təşkilatı; **UN ~** Birləşmiş Millətlər Təşkilatı; **youth ~** gənclər təşkilatı

**organizational** [ˌɔ:gənaɪ'zeɪʃənl] *adj* təşkilati; ~ **chart** təşkilat strukturu; ~ **effectiveness** təşkilati səmərəlilik; ~ **model** təşkilati model; ~ **policy** struktural siyasət; ~ **structure** təşkilati struktur/quruluş; ~ **unit** təşkilati vahid

**organize, -ise** ['ɔ:gənaɪz] *v* **1.** formalaşdırmaq, qurmaq, yaratmaq; formalaşmaq, yaranmaq **2.** qaydaya / nizama salmaq, sistemləşdirmək, sıra ilə/ardıcıllıqla düzmək; yerbəyer etmək, cəmləmək; *She stood silently trying to organize her thoughts Qız fikrini cəmləmək üçün sakit dayanmışdı; We must finally organize our files properly Biz nəhayət fayllarımızı yerbəyer etməliyik;* **3.** təşkil etmək, planlaşdırmaq; yönəltmək *(hər hansı sosial quruluşu, fəaliyyəti və s.);* ~ **the House** Konqresin əsas məsul işçilərini və komissiyalarını seçmək; **4.** *d.d.* yerinə qoymaq, qaydaya salmaq, çözmək; *Everything must be organized well Hər şey qaydaya salınmalıdır*

**organized** ['ɔ:gənaɪzd] *adj* **1.** mütəşəkkil, təşkil olunmuş; **an ~ body** mütəşəkkil insan qrupu; ~ **labour** həmkarlar ittifaqının üzvləri; **2.** *biol.* üzvi, canlı; ~ **matter** canlı materiya

**organizer** ['ɔ:gənaɪzə<sup>r</sup>] *n* təşkilatçı, təşkil edən; **first-rate** ~ əla təşkilatçı

**orgiastic** [ˌɔ:dʒɪ'æstɪk] *adj* əxlaqsız, pozğun, azğın, quduruğan

**orgy** ['ɔ:dʒɪ] *n* **1.** eyş-işrət, azğıncasına keyf; **to engage in/ to stage an** ~ eyş işrətlə məşğul olmaq; **2.** *d.d.* çoxluq *(kef, eyş-işrət haq.)*

**oriel** ['ɔ:rɪəl] *n mem.* **1.** taxça, yataq yeri, divar oyuğu, camaxatan; **2.** bağlı şüşəbənd

**orient**[1] ['ɔ:rɪənt] *n* **1.** *şair.* şərq, səmanın şərq tərəfi; **2.** *şair.* şərq, şərq torpaqları/ ölkələri; **in the** ~ şərqdə; **pearl of** ~ şərq mirvarisi *(xüsusi qiymətə malik mirvari);* **3.** *arx.* dan yerinin sökülməsi, günün doğması

**orient**[2] ['ɔ:rɪənt] *adj* **1.** *şair.* şərq *(şərqdə yerləşən, şərqə aid olan);* **2.** *şair.* qalxan, doğan *(günəş haq.);* açılan, sökülən *(sabah, səhər, dan);* ~ **sun** doğan günəş; **3.** mirvari; şəffaf-mavi *(yüksək keyfiyyətli mirvarinin rəngi);* **4.** *şair.* qiymətsiz, qiyməti bilinməyən, füsunkar; bərq vuran, alov saçan *(xüsusi gözəllik və keyfiyyətə malik olan qiymətli daşlar və mirvari haq.);* **5.** *məc.* iti, parlaq; nadir *(zəka və s.);* **6.** qızaran, al rəngə çalan, dan yerinə bənzər

**orient**[3] ['ɔ:rɪənt] *v* **1.** yerləşdirmək, qoymaq; saxlamaq *(üzü şərqə);* üzü/qabaq hissəsi şərqə yönəlmiş bina tikmək *(xüs. kilsə);* çevirmək, döndərmək, səmt götürmək, irəliləmək, üz tutmaq *(adətən şərqə); He oriented east O, şərqə üz tutdu;* **2.** yerin dörd tərəfinə əsasən mövqeyi müəyyənləşdirmək; səmtləşdirmək, yönəlmək *(kompas və s. görə);* **to ~ oneself** yerini müəyyən etmək, səmtini tapmaq; **3.** *məc.* müəyyənləşmək, lazımi / istədiyi yolu tapmaq, hər hansı müəyyən səmtə yönəltmək *(hadisələri, həyatın axarını və s.);*

**oriental**[1] [ˌɔ:rɪ'entl] *n* şərqli, şərqdə yaşayan

**oriental**[2] [ˌɔ:rɪ'entl] *adj* **1.** şərq, şərqə aid; ~ **countries / customs / languages / carpet** şərq ölkələri / adətləri / dilləri / xalçası; **2.** zəngin, qiymətli, bərq vuran *(qiymətli daşlar haq.)*

**orientalism** [ˌɔ:rɪ'entəlɪzm] *n* **1.** orientalizm *(Şərq xalqlarının mədəniyyəti, adət və ənənələrini öyrənən elm);* **2.** şərq aksenti, şərq sözlərinin istifadəsi; **3.** şərqşünaslıq, orientalistika

**orientalist** [ˌɔ:rɪ'entəlɪst] *n* şərqşünas, orientalist

**orientate** ['ɔ:rɪenteɪt] *v* olduğu yerin səmtini müəyyən etmək; bələd olmaq, alışmaq *(şəraitə və s.)*

**orientation** [ˌɔ:rɪen'teɪʃn] *n* **1.** yerləşdirmə, qurma, şərq tərəfə istiqamətləndirmə; **2.** yerin / səmtin/istiqamətin müəyyənləşdirilməsi; **to give / to offer** *smb.* **(an) ~ (to)** bir kəsi istiqamətləndirmək, bir kəsə səmt göstərmək; **to get / to go through (an)** ~ istiqaməti / səmti/yönü tapmaq; **3.** istiqamət, kurs, səmt, yön; **4.** koordinasiya etmə

**orienteering** [ˌɔ:rɪen'tɪərɪŋ] *n id.* istiqamət tapma üzrə idman növü

**orienter** [ˌɔ:rɪen'tɪə<sup>r</sup>] *n* istiqaməti / səmti / yönü tapmaq / müəyyən etmək üçün cihaz; **gravity** ~ qravitasiya tipli qurğuların səmtləndirmə cihazı

**orifice** ['ɔrɪfɪs] *n* **1.** dəlik, deşik *(boru, daxili orqanlar, yara və s. haq.);* **2.** böyük/iri deşik/dəlik; giriş və ya çıxış *(şaxta, mədən, mağara və s. haq.);* keçid, hava borusu; **3.** *tex.* ucluq, uca taxılan alət/hissə

**origin** ['ɔrɪdʒɪn] *n* **1.** başlanğıc, mənbə; **the ~ of the quarrel** mübahisənin mənbəyi; **2.** əmələ gəlmə; törəmə; **the ~ of a word / of a language** sözün/dilin əmələ gəlməsi; **3.** əsl-nəcabət; milliyyət; **of humble** ~ əsli-nəcabəti tanınmayan; **evidence of** ~ milliyyəti haqda şəhadətnamə; **country of** ~ doğum yeri; **4.** *riyaz.* koordinatların başlanğıcı

**original**[1] [ə'rɪdʒənl] *n* **1.** orijinal, əsl; orijinal əsər; **to take a copy from the** ~ orijinaldan surət çıxarmaq; **to read a novel in the** ~ romanı orijinalda oxumaq; *They are studying English in order to read Shakespeare in the original Onlar ingilis dilini öyrənirlər ki, Şekspiri orijinalda oxusunlar;* **2.** qəribə / əcaib adam; *This man is a real original Bu kişi lap qəribə adamdır*

**original**[2] [ə'rɪdʒənl] *adj* **1.** ilkin, ilk, birinci, başlanğıc; **the ~ part of the house** evin ən qədim *(ilk tikilən)* hissəsi; **to buy at the ~ price** başlanğıc qiymətə almaq; **by the ~ scheme** ilkin plana görə; ~ **sin** *din.* başlıca səhv/ günah; **2.** başlanğıc, əzəli, bir şeyin əvvəlini/başlanğıcını təşkil edən; əsas; ~ **writ** ilk qanun toplusu; **3.** əsl, orijinal; **the ~ picture** şəklin əsli/orijinalı; ~ **print** əsl surət; **4.** təzə, tər; özünəməxsus;



heç kimdən götürülməmiş; şəxsi; ~ **opinion / point of view/remark** şəxsi fikir/nöqteyi-nəzər/qeyd; **5.** qeyri-adi, hamıdan seçilən; yaradıcı, orijinal; fərasətli, iş bacaran *(insan haq.);* ~ **painter/ composer / writer/thinker** öz dəsti-xətti olan rəssam/bəstəkar/yazıçı/mütəfəkkir; **a person of an ~ mind** özünəməxsus ağıl tərzinə/təfəkkürə malik insan; *He was a very original man and with an extremely original behaviour O çox qəribə insan idi və özünü çox qeyri-adi aparırdı;* **6.** anadangəlmə; *He was an original rogue O, anadangəlmə fırıldaqçı idi*

**originality** [əˌrɪdʒɪ'nælɪtɪ] *n* **1.** əslilik *(rəsm/sənət əsərləri və s. haq.);* **2.** orijinallıq, özünəməxsusluq, unikallıq *(fikir, əməl və s. haq.);* **a writer /a painter of great ~** böyük zəkaya malik yazıçı / rəssam; **the ~ of Leonardo da Vinci** Leonardo da Vinçinin orijinallığı; **to display / to show ~** orijinallıq / özünəməxsusluq göstərmək; **3.** yenilik, təzəlik; maraqlılıq, qeyri-adilik; *That work was of no originality for me Bu iş mənə xeyli maraqsız görünürdü*

**originally** [ə'rɪdʒɪnəlɪ] *adv* **1.** ilkin olaraq, əslinə görə; milliyyətcə; *He is originally German O əslən almandır;* **2.** əzəldən, əvvəlcə, başlanğıcdan, kökündən, mənbəsindən; *The bricks had originally been a deep dark red Kərpiclər əvvəlcə tünd qırmızı rəngdə idilər;* **3.** özünəməxsusluqla, yeni şəkildə; qeyri-adi tərzdə; *The author treats this subject very originally Müəllif bu mövzudan özünəməxsus tərzdə bəhs edir*

**originate** [ə'rɪdʒɪneɪt] *v* **1.** təməlini/əzəlini / özülünü / başlanğıcını qoymaq; yaratmaq; **to ~ a new style in music** musiqidə yeni üslub/istiqamət yaratmaq; **2. (from, in, with)** başlanğıcını götürmək, yaranmaq, əmələ gəlmək, baş vermək; *With whom did the idea originate? Bu fikir birinci kimin ağlına gəldi ?*

**origination** [əˌrɪdʒɪ'neɪʃn] *n* **1.** əzəl, başlanğıc; **2.** yaranma, əmələ gəlmə, doğma

**originative** [ə'rɪdʒɪneɪtɪv] *adj* **1.** təməlini qoyan, həyat verən; **2.** yaradıcı, qurucu, kəşf edici / edən

**originator** [ə'rɪdʒɪneɪtə<sup>r</sup>] *n* **1.** müəllif, yaradıcı, yaradan; **2.** təşəbbüskar

**orison** ['ɔ:rɪzn] *n şair.* dua; *Remember me in your orisons Məni dualarında/dualarınızda yad et/edin*

**orlop** ['ɔ:lɔp] *n dən.* **1.** aşağı göyərtə; **2.** *tar.* kubrik

**ornament**[1] ['ɔ:nəmənt] *n* **1.** ornament, naxış, bəzək, yaraşıq; *He is an ornament of our group O, qrupumuzun yaraşığıdır;* **2.** kilsə ləvazimatı/əşyaları, cübbələr; **3.** iftixar, fəxr; öz dövrünün, cəmiyyətinin və s. iftixarı olan insan; **4.** bəzəmə / naxışvurma prosesi

**ornament**[2] ['ɔ:nəmənt] *v* bəzəmək, naxış vurmaq, bəzək vermək

**ornamental**[1] [ˌɔ:nə'mentl] *n* **1.** bəzək bitkisi *(dekorativ);* **2.** adi bəzək-düzək

**ornamental**[2] [ˌɔ:nə'mentl] *adj* dekorativ, bəzək üçün işlədilən, ornamental, naxışlı

**ornamentation** [ˌɔ:nəmen'teɪʃn] *n* **1.** bəzəmə/ naxışvurma prosesi; **2.** bəzək-düzək; **3.** *mus.* bəzək, tremmolo, cəh-cəh *(boğazla edilən çətin səs əməliyyatı)*

**ornate** [ɔ:'neɪt] *adj* **1.** zəngin bəzədilmiş; **2.** təmtəraqlı, dəbdəbəli, mübaliğəli; qəliz *(üslub haq.)*

**ornery** ['ɔ:nərɪ] *adj d.d.* **1.** hirsli, acıqlı, qəzəbli; əsəbi, tez özündən çıxan; **2.** zəhlətökən, bezdirən; **3.** pis keyfiyyətə malik, ortabab, adi

**ornithological** [ˌɔ:nɪθə'lɔdʒɪkl] *adj* ornitoloji *(quşlar haqqında elmə aid olan)*

**ornithologist** [ˌɔ:nɪ'θɔlədʒɪst] *n* ornitoloq *(quşların həyatı ilə məşğul olan alim)*

**ornithology** [ˌɔ:nɪ'θɔlədʒɪ] *n* ornitologiya *(quşların həyatı haqda elm)*

**orography** [ou'rɔgrəfɪ] *n* oroqrafiya *(relyefin təsvir edilməsi)*

**orometer** [ourə'mi:tə<sup>r</sup>] *n geol.* hündürlük ölçən cihaz

**orotund** ['ɔroutʌnd] *adj* **1.** səsli, dolğun; möhtəşəm; **2.** *məc.* özündən razı, dəbbə, lovğa, dikburun; iddialı, təşəxxüslü

**orphan**[1] ['ɔ:fn] *n* **1.** kimsəsiz uşaq, yetim; **to be left an** ~ kimsəsiz/yetim qalmaq; **war** ~ müharibədə valideynlərini itirmiş yetim uşaq; **2.** *məc.* köməkdən / yardımdan / qayğıdan məhrum olan adam; **3.** *d.d.* köhnə markalı avtomobil

**orphan**[2] ['ɔ:fn] *adj* yetim, kimsəsiz; **an ~ child** yetim/kimsəsiz uşaq

**orphan**[3] ['ɔ:fn] *v* kimsəsiz/yetim qoymaq; valideynlərindən məhrum etmək

**orphanage** ['ɔ:fənɪdʒ] *n* **1.** kimsəsizlik, yetimlik; **2.** kimsəsizlər, yetimlər **3.** uşaq evi, yetimxana

**orphanhood** ['ɔ:fnhu:d] *n* kimsəsizlik, yetimlik

**orthodox** ['ɔ:θədɔks] *adj* **1.** hamı tərəfindən qəbul edilmiş, ənənəvi; ~ **opinion** hamı tərəfindən qəbul edilmiş fikir; **2.** ortodoksal, mömin; **3.** *din.* pravoslav

**orthodoxy** ['ɔ:θədɔksɪ] *n* **1.** ortodoksallıq, ortodoksluq; **strict ~** ciddi ortodoksallıq; **2.** ənənəvilik, hamı tərəfindən qəbul edilmə; **3.** *din.* pravoslavlıq

**orthoepy** ['ɔ:θouepɪ] *n dilç.* orfoepiya *(düzgün tələffüz qaydaları)*

**orthogon** ['ɔ:θəgən] *n hənd.* düzbucaqlı

**orthogonal** [ˌɔ:θə'gɔnl] *adj hənd.* düzbucaqlı, bucağı düz olan; ~ **projection** düzbucaqlı proyeksiya

**orthographer** [ˌɔ:'θɔgrəfə<sup>r</sup>] *n* orfoqraf, orfoqrafiya mütəxəssisi

**orthographic** [ˌɔ:θə'græfɪk] *adj dilç.* orfoqrafik; səhvsiz yazılmış

**orthographist** [ˌɔ:'θɔgrəfɪst] *n* = **orthographer**

**orthography** [ˌɔ:'θɔgrəfɪ] *n dilç.* orfoqrafiya, düzgün yazı qaydası

**orthopaedic** [.ɔ:θou'pi:dık] *adj tib.* ortopedik
**orthopaedist** [.ɔ:θou'pi:dıst] *n tib.* ortoped, sınıqçı
**orthopaedy** [.ɔ:θou'pi:dı] *n tib.* ortopediya
**ortogonal** [ɔ:'tɔgnl] *adj* ortoqonal, perpendikulyar; ~ **rotation** *riyaz.* ortoqonal çevrilmə/dönmə
**oscillate** ['ɔsıleıt] *v* **1.** yırğalanmaq, yırğalamaq, löngər vurmaq, rəqs etmək; **2.** vibrasiya etmək, əsmək, titrəmək; **3.** *məc.* tərəddüd etmək; **to ~ between two opinions** iki fikir arasında tərəddüd etmək
**oscillation** [.ɔsı'leıʃn] *n* **1.** yırğalanma, löngərlənmə; vibrasiya, əsmə, titrəmə, rəqs etmə; ~ **frequency** rəqs etmə tezliyi; **2.** *məc.* tərəddüd, qeyri-sabitlik, qərarsızlıq; **3.** *fiz.* titrəmə, əsmə, rəqs etmə, dəyişmə; **4.** *riyaz.* funksiyanın hüdudlar arasında dəyişməsi; **5.** *fiz.* elektrikin rəqs etməsi
**oscillator** [.ɔsı'leıtəʳ] *n tex.* vibrator, ossilyator
**oscillatory** ['ɔsılətrı] *adj* **1.** əsən, titrəyən, rəqs edən, dəyişən; **2.** *məc.* tərəddüd edən, qərarsız, cəsarətsiz
**oscillogram** [.ɔsı'lɔgrəm] *n fiz.* ossilloqram
**oscillograph** [.ɔsı'lɔgra:f] *n fiz.* ossilloqraf *(ölçü cihazı)*
**oscillography** [.ɔsı'lɔgrəfı] *n fiz.* ossilloqrafiya
**osculate** ['ɔskjuleıt] *v* **1.** *arx.* öpüşmək; **2.** yan-yana olmaq, həmsərhəd olmaq, toxunmaq
**osculation** [.ɔskju'leıʃn] *n* **1.** *arx.* öpüş; **2.** toxunma, dəymə; **3.** *riyaz.* toxunma/təmas nöqtəsi
**osier**[1] ['ouzəʳ] *n* **1.** *bot.* söyüd; **2.** söyüdlü sahil
**osier**[2] ['ouzəʳ] *adj* söyüd, söyüddən düzəldilmiş
**osselet** ['ɔsılət] *n anat.* kiçik sümük
**osseous** ['ɔsıəs] *adj* sümük, sümüklü; sümük kimi möhkəm
**ossification** [ɔsıfı'keıʃn] *n* **1.** sümükləşmə; sümüklərin formalaşması; **2.** *məc.* qabalaşma, ürəyi daşa dönmə, rəhmsizləşmə; kobudlaşma
**ossify** ['ɔsıfaı] *v (pt, pp* **-ied***)* **1.** sümüyə çevrilmək, sümükləşmək; **2.** *məc.* bayatımaq, qurumaq; kobudlaşmaq, qəddarlaşmaq; hissiyyatsızlaşdırmaq; amansızlaşdırmaq
**ossuary** ['ɔsjuərı] *n* **1.** sərdabə; sümüklə dolu mağara; **2.** kremasiya urnası *(insanın yandırılmasından sonra külünün yığıldığı dəmir qab)*; **3.** keçmişin təbərrüklərinin saxlanıldığı yer
**ostensible** [ɔs'tensəbl] *adj* **1.** bəhanə rolu oynayan; yalançı, zahiri, süni; ~ **purpose** zahiri məqsəd; **2.** *arx.* açıq-aydın, bəlli
**ostentation** [ɔsten'teıʃn] *n* **1.** nümayiş etdirmə; **2.** bir şeyin süni təzahürü; lovğalıq; təşəxxüs
**ostler** ['ɔsləʳ] *n* mehtər *(karvansarada)*
**ostrich**[1] ['ɔstrıtʃ] *n* **1.** *zool.* dəvəquşu; **2.** *məc.* xoşagəlməz reallıqdan qaçan insan / adam
**ostrich**[2] ['ɔstrıtʃ] *adj* dəvəquşu; ~ **plume** dəvəquşu lələyi; ~ **policy** özünüaldatma üzərində qurulmuş siyasət
**other**[1] ['ʌðəʳ] *adj* **1.** daha, əlavə; *How many other brothers have you? Sənin / sizin daha neçə qardaşın / qardaşınız var?; There are some other people waiting to see you Səni / Sizi görmək istəyən əlavə bir neçə adam var;* **2.** başqa, ayrı; *He has no other place to go Onun gedəbiləcəyi başqa yer yoxdur; He is busy now, ask him about it some other time O indi məşğuldur, bunu ondan başqa vaxt soruş / soruşun;* **in ~ circumstances** başqa vəziyyətlərdə; *The other tourists remained in the camp Başqa turistlər düşərgədə qaldılar;* **the ~ day** bu günlərdə, bu yaxınlarda; **the ~ side** ikinci/digər tərəf;
◊ ~ **times**, ~ **manners** zaman başqa - adət başqa; ~ **world** o biri dünya; **to sancel each ~** bir-birini məhv etmək; **for some purpose or ~** nəyə görəsə, bu və ya digər məqsədlə; **from each ~** bir birindən; **on the ~ hand** digər tərəfdən; ~ **than zero** sıfırdan başqa; **very much the ~ way** tam əksinə; **with each ~** bir biri ilə; **each ~** bir birini*(ə)*; **in ~ words** başqa / digər sözlə; **somehow or ~** *riyaz.* bu və yaxud digər yolla; **the ~** yerdə qalan
**other**[2] ['ʌðəʳ] *pron* **1.** başqa, digər; **some day /time or ~** nə vaxtsa, əvvəl-axır; **2.** o birisi, ikincisi; *One brother is a doctor, the other a lawyer Bir qardaş həkim, ikincisi (o birisi) hüquqşünasdır;* **3.** *pl* başqaları, digərləri; **to think of ~s** başqaları haqqında fikirləşmək / düşünmək; *I must consult the others Mən başqaları ilə məsləhətləşməliyəm*
**other**[3] ['ʌðəʳ] *adv* başqa cür
**otherness** ['ʌðənıs] *n* fərq, başqalıq; oxşarsızlıq, fərqli xüsusiyyət
**others**[1] ['ʌðəs] *n* digərləri
**others**[2] ['ʌðəs] *pron* kimsə, bəziləri, digərləri
**otherwhere** ['ʌðəw?əʳ] *adv şair.* başqa yerdə, başqa yerə
**otherwise** ['ʌðəwaız] *adv* **1.** yoxsa, əks təqdirdə; başqa cür, digər halda / tərzdə; *This must be done quite otherwise Bu tamam başqa cür edilməlidir; I went at once; otherwise I should have missed the train Mən o saat çıxıb getdim. Yoxsa qatara çata bilməzdim;* **2.** digər məsələlərdə, digər işlərdə; *I have otherwise no reason to suspect them Başqa məsələlərdə onlardan şübhələnməyimə əsasım yoxdur;* **3.** və yaxud, əks təqdirdə, belə olmayan halda, digər sözlə; başqa şəraitdə/halda/vəziyyətdə; *Do what I tell you, otherwise you'll be sorry Dediyimə əməl et / edin, əks təqdirdə peşman olarsan / olarsınız*
**otherwise-minded** ['ʌðəwaız 'maındıd] *adj* fərqli düşüncəyə/fikrə malik, başqa cür düşünən / fikirləşən
**otiose** ['ouʃıouz] *adj* **1.** faydasız, xeyirsiz, əbəs, lazımsız; bəhrəsiz; **long ~ discriptions** uzun, faydasız təsvirlər; **2.** tənbəl, arxayın
**otioseness** ['ouʃıouznıs] *n* **1.** müvəffəqiyyətsizlik, faydasızlıq, əbəslik; **2.** arxayınçılıq, tənbəllik



**otter**[1] ['ɔtəʳ] *n zool.* **1. 1)** susamuru; **2)** susamurunun xəzi/dərisi; **2.** balıqçı ləvazimatı *(çoxlu qırmağı olan uzun taxta qaravul)*; **3.** *dən.* xətt boyu qarovul çəkən gəmi
**otter**[2] ['ɔtəʳ] *v* **1.** susamuru ovlamaq; **2.** xüsusi balıqçı aləti ilə balıq tutmaq
**ottoman**[1] ['ɔtoumən] *n* I osmanlı, türk
**ottoman** ['ɔtoumən] *n* II divan, taxt
**ottoman**[2] ['ɔtoumən] *adj* osmanlı, türk; ~ **Empire** Osmanlı İmperiyası
**ouch** [autʃ] *int.* ay!, oy!, vay!, vaxsey! *(ağrı, inciklik, əfsusluq və s. ifadə edir)*
**ought**[1] [ɔ:t] *n* **I** *d.d.* = **nought**
**ought** [ɔ:t] *n* **II** mənəvi vəzifə / borc; *His master had told him a little about his oughts Müəllimi onunla onun mənəvi vəzifələri haqda bir az söhbət etmişdi*
**ought**[2] [ɔ:t] *v (pt, pp* **ought***) modal fel kimi işlənir və aşağıdakı mənalar ifadə edir:* **1)** gərəklik; *I ought to pay our debts Mən gərək borcumuzu ödəyim;* **2)** arzu, məqsədəuyğunluq; *You ought to take care of yourself Sən / Siz gərək özünə / özünüzə fikir verəsən / verəsiniz; Children ought to respect their parents Uşaqlar gərək valideynlərinə hörmət etsinlər;* **3)** ümud, fərziyyə; güman; *He ought to be here by now O bu vaxta kimi gərək burada olaydı;* **4)** *Mərhəmət, danlaq, təəssüf ifadə edir (əsasən* **ought to + perfect** *formasında); You ought to have seen the look on her face Sən bir onun üzündəki ifadəni görəydin*
**ounce** [auns] *n* I **1.** unsiya *(= 28,34 qr)*; **fluid ~** maye unsiya; **2.** bir damcı, az, azca, zərrə qədər; *He hasn't got an ounce of sense Onun zərrə qədər də düşüncəsi / ağlı yoxdur; An ounce of practice is worth a pound of theory at.söz.* ≅ *Bir dəfə görmək min dəfə eşitməkdən yaxşıdır*
**ounce** [auns] *n* II *zool.* bəbir
**our** ['auəʳ] *poss. pron* bizim; ~ **country** bizim vətənimiz
**ours** ['auəz] *poss. pron* bizimki, bizim, biz; *This house is ours Bu ev bizimkidir; It is no business of ours Bu bizim işimiz deyil; Smith is of ours Smit bizimkidir / bizim adamdır; Ours is a large family Biz böyük ailəyik;*
**ourselves** [.auə'selvz] *ref. pron* **1.** özümüz; *We built the house ourselves Biz evi özümüz tikdik;* **2.** özümüzü, özümüzə; *We should blame ourselves for what happened Baş verənlər üçün biz özümüzü günahlandırmalıyıq/qınamalıyıq*
**oust** [aust] *v* **1.** qovmaq, sıxışdırıb aradan çıxartmaq, yıxmaq, devirmək, aradan götürmək; **to ~ from the place** vəzifədən qovmaq / çıxartmaq; *The present language ousted the former Müasir dil qədim dili sıxışdırıb aradan çıxartdı;* **2.** *hüq.* evindən çıxarmaq/ köçürmək
**ouster** ['austəʳ] *n hüq.* **1.** daşınmaz əmlak /mülkiyyət üzərində hüquqdan məhrum etmə, yaşadığı yerdən çıxarma *(məhkəmənin qərarı ilə, çevriliş və ya inqilab nəticəsində)*; **2.** işdən çıxarma, istefaya göndərmə
**out**[1] [aut] *n* **1.** bir şeyin bayır/xaric tərəfi; **2.** çıxış, çıxış yolu *(çətin vəziyyətdən)*; **3.**: **the outs** müxalifət; **4.** buraxılış vərəqəsi; **5.** *id.* oyunçunu çıxartma; çıxarılan oyunçu **6.** *id.* topun meydandan çıxması
◊ **at the ~s** gərgin münasibətdə olma, küsmüş vəziyyətdə olma
**out**[2] [aut] *adj* **1.** xarici, bayır; kənar; **2.** *id.* oyundan kənar, meydandan kənarda; **3.** qeyri-adi/böyük ölçülü; ~ **size** çox böyük ölçü; **4.** başqa yerdə fəaliyyət göstərən və ya baş verən; ~ **match** rəqib meydançasında oyun; **5.** qaib, yerində olmayan; **6.** dəbdən düşmüş; **7.** *tex.* söndürülmüş *(işıq haq.)*
**out**[3] [aut] *v* **1.** *(***from***)* qovmaq, bayıra çıxarmaq; **2.** məhrum etmək; **3.** söndürmək *(işığı, alovu və s.)*; **4.** məhv etmək; **5.** *id. d.d.* nokauta salmaq *(boksda)*; **6.** *id.* topu vurub meydandan kənara çıxartmaq; **7.** *d.d.* gəzməyə/ekskursiyaya getmək; **8.** **(with)** *d.d.* ağızdan qaçırmaq, açmaq *(sirr və s.haq.)*; *He outed with the story O, əhvalatı ağzından qaçırdı*
**out**[4] [aut] *adv* **1.** bayıra, kənara, bayırda; *She has gone out O, bayıra çıxıb;* **2.** *bir şeyin sonunu/ bitməsini bildirir;* **before the month is ~** ayın axırına kimi / qədər; **3.** *bir şeyin bitməsini/ qurtarmasını bildirir; The food ran out Ərzaq qurtardı;* **4.** *hər hansı normadan / qaydadan / həqiqətdən kənara çıxmanı, dəbdən düşməni bildirir; Jazz is out Caz artıq dəbdə deyil/ dəbdən düşüb;*
◊ ~ **and about** xəstəlikdən sağaldıqdan sonra; ~ **and away** xeyli / müqayisəsiz dərəcədə; **to be ~ to smth.** var qüvvəsi ilə nəyəsə nail olmağa çalışmaq/can atmaq; *She is out for compliment Qız çalışır ki, onu tərifləsinlər;* **to be ~ with** kiminləsə küsülü olmaq, kiminləsə qanlı-bıçaq olmaq
**out**[5] [aut] *prep* **(out of)** *Azərbaycan türkcəsinə çıxışlıq hal şəkilçiləri* **(-dan;-dən)** *və inkarlıq bildirən şəkilçilər* **(-sız; -siz; -suz; -süz)** *vasitəsilə tərcümə edilir və ya tərcümə edilmir. Aşağıdakı mənalara işarə edir:* **1)** *bir əşyadan kənar olma/hüdudlarından çıxma vəziyyətinə:* ~ **of turn** növbədən kənar; **Out of sight, out of mind** *at. söz.* Gözdən uzaq, könüldən iraq; **2)** *hər hansı hüduddan çıxan hərəkətə:* ~ **of sequence** nizamsız, nizamdan kənar; **3)** *hər hansı əşya və ya xüsusiyyətin olmamasına:* ~ **of money** pulsuz; ~ **of work** işsiz; ~ **of time** vaxtsız, bivaxt; **4)** *əşyanın düzəldiyi materiala: The souvenir was made out of glass Suvenir şüşədən düzəldilmişdi;* **5)** *tamın və hissələrin nisbətinə:* **five ~ of ten** ondan beşi; **6)** *hərəkətin səbəbinə və nəticəsinə:* ~ **of envy** paxıllıqdan; ~ **of necessity** ehtiyacdan; **7)** *musiqi ritminə/ahənginə uyğun olmamağa:* **out ~ tune** xaric; ~ **of use** ista-

fadədən çıxmış; **8)** : ~ **of health** xəstə, nasaz; ~ **of mind** yaddan çıxarılmış, yaddaşdan silinmiş, unudulmuş; **9)** : **to be done ~ of** *smth.* bir şeydən məhrum edilmək *(hiylə yolu ilə)*; **to be ~ of one's mind** ağlını itirmək

**out[6]** [aut] *inter arx. Rədd ol! İtil! Cəhənnəm ol!*

**outage** ['autıdʒ] *n* **1.** işdə fasilə; hərəkətsizlik; **scheduled** ~ planlaşdırılmış fasilə; **2.** xarab olma; **3.** itki, sızma; **power** ~ enerji sızması / itməsi

**outback** ['autbæk] *n* əhalisi az olan yer/ərazi

**outbalance** [aut'bæləns] *v* **1.** çəkisi daha ağır gəlmək, əymək; **2.** ötüb keçmək, üstün gəlmək, artıq olmaq

**outbargain** [aut'ba:geın] *v* ticarət müqavilələrini rəqiblərdən daha əlverişli şərtlərlə bağlamaq

**outbid** [aut'bıd] *v (pt, pp* **outbid***)* **1.** qiyməti qaldırmaq, daha yüksək qiymət təklif etmək *(hərracda)*; **2.** üstün gəlmək, kölgədə qoymaq

**outboard** ['autbɔ:d] *adv* bortdan kənar; borta yaxın

**outbound** ['autbaund] *adj* **1.** uzaq səyahətə və ya ölkəyə səfərə çıxan gəmi; beynəlxalq reys edən təyyarə; **2.** xaricə göndərilən / ixrac edilən; ~ **cargo** göndərilən /ixrac edilən yük

**outbrave** [aut'breıv] *v* **1.** irad və hücumlara hünərlə sinə gərmək; bir şeyə qarşı cəsarətlə müqavimət göstərmək; *He was outfacing his accusers, and outbraving their accusations O öz ittihamçılarının qarşısında özünü həyasızcasına aparır və onların ittihamlarına cəsarətlə qarşı çıxırdı;* **2.** üstün gəlmək, kölgədə qoymaq; *The charming bride outbraved all Füsunkar gəlin gözəllikdə hamını kölgədə qoydu*

**outbreak[1]** ['autbreık] *n* **1.** püskürmə, yarılma; partlayış, alovlanma; qəfil əmələ gəlmə/başlama/ hücum; **volcanic** ~ vulkan püskürməsi; **an ~ of measles** qızılca epidemiyasının sürətlə yayılması; **an ~ of locusts** çəyirtkələrin qəfil / gözlənilməz hücumu; **the ~ of war** müharibənin qəfil başlanması; **2.** üsyan; narazılıq, qiyam; **a popular** ~ xalq üsyanı/qiyamı

**outbreak[2]** ['autbreık] *v (pt* **outbroke** ['-brouk]; *pp* **outbroken** ['-broukn]*) şair.* **1.** alovlanmaq, çaxmaq *(şimşək)*; partlamaq; *Now and then outbrakes the light Hərdənbir işıq yanır; A frightful clamour from the wall outbroke Divarın arxasından ətürpədici bir səs gəldi;* **2.** çiçəklənmək, çiçək açmaq

**outbuild** [aut'bıld] *v (pt, pp* **outbuilt***)* **1.** daha möhkəm/keyfiyyətli tikmək, tikintidə üstün olmaq; **2.** həddən artıq çox bina tikmək

**outburst** ['autbə:st] *n* **1.** partlayış, püskürtü, gözqamaşdırıcı işıq; **2.** *məc.* qeyri-adi/ gözlənilməz təzahür; **an ~ of anger** hirsin/hiddətin partlayışı; **furious/violent** ~ şiddətli/bərk partlayış; **sudden** ~ qəfil partlayış; **3.** vulkan püskürməsi; **4.** *astr.* günəşdə partlayış; **5.** *geol.* yer laylarının üzə çıxması

**outcast[1]** ['autka:st] *n* **1.** sürgün edilmiş adam; səfil, sərsəri, evsiz, avara; sərgərdan; **gypsies, beggars and other social ~** qaraçılar, dilənçilər və digər sosial səfillər; *He died as outcast of both church and state O, həm kilsə, həm də dövlət tərəfindən rədd edilmiş adam kimi vəfat etdi;* **2.** tullantı, zibil

**outcast[2]** ['autka:st] *adj* **1.** qovulmuş, rədd edilmiş, səfil, evsiz-eşiksiz; *In this state of outcast misery he lived for more than four years Bu cür yoxsulluq içində o, dörd ildən artıq yaşadı; The villages were covered with outcast families, reduced to beggary Kəndlər evsiz-eşiksiz, dilənçi halına salınmış ailələr ilə dolu idi;* **2.** atılmış, tərk edilmiş; yalqız; **3.** kənara atılmış; keyfiyyətsiz, lazımsız *(əşya, mal və s.)*; ~ **eatables** yeyiləsi olmayan azuqə / ərzaq, tullantılar

**outclass** [aut'kla:s] *v* **1.** çox arxada qoymaq; üstün gəlmək; betər olmaq; *As a liar he outclassed everybody Yalançılıqda o hamıdan betər idi;* **2.** *id.* qalib gəlmək, üstün olmaq; daha yüksək dərəcəyə malik olmaq

**outcome** ['autkʌm] *n* **1.** yekun, nəticə; **the ~ of an election** seçkinin nəticəsi **2.** çıxış, bayıra çıxış dəliyi

**outcrop[1]** ['autkrɔp] *n* **1.** *geol.* süxurların üzə çıxması; **2.** təsadüfən aşkar etmə, tapma, təzahür

**outcrop[2]** ['autkrɔp] *v* **1.** *geol.* üzə çıxmaq, səthə çıxmaq *(süxur və s.)*; **2.** təsadüfən aşkarlanmaq, tapılmaq/rast gəlinmək; *A few suspicious words here and there outcrop in the narrative Hekayənin bəzi yerlərində anlaşılmaz sözlərə rast gəlmək olur*

**outcry[1]** ['autkraı] *n* **1.** dəhşətli bağırtı; fəryad, hayqırtı; **2.** *məc.* səsli-küylü etiraz; ədalətli qəzəb; **public** ~ ictimai etiraz; **to make / to raise an** ~ hay-küy qaldırmaq; *The outcry over such practices has led to reforms Bu cür fırıldaqlara qarşı səs-küylü etiraz islahatlara gətirib çıxardı;* **3.** küçə satıcılarının qışqırtısı

**outcry[2]** ['autkraı] *v (pt, pp* **-ied***)* **1.** bərkdən / hündürdən qışqırmaq, bir-birini qışqıraraq səsləmək; bağırtı ilə kiminsə səsini batırmaq; **2.** etiraz etmək

**outdance** ['autda:ns] *v* hamıdan yaxşı və çox oynamaq/rəqs etmək

**outdare** ['autdeəʳ] *v* **1.** cəsarətdə / ötkəmlikdə üstün olmaq; **2.** yarışa / döyüşə çağırmaq

**outdated** ['autdeıtıd] *adj* köhnəlmiş, dəbdən düşmüş / çıxmış

**outdoor** ['autdɔ:ʳ] *adj* **1.** açıq havada/bayırda yerləşən /baş verən; ~ **hockey** açıq havada oynanılan hokkey; ~ **telephone booth** küçədə yerləşən telefon budkası; ~ **person** gəzinti və səfərlərdə vaxtını keçirməyi sevən adam; ~ **swimming pool** üstü açıq üzgüçülük hovuzu; ~ **games** açıq havada keçirilən oyunlar; ~ **theatre** üstü açıq teatr, yaşıl teatr; **2.** bayır, çöl; ~ **air** çöl



/ bayır havası; ~ **aerial** bayırda quraşdırılan antenna; **3.** evdən kənarda istifadə edilməsi nəzərdə tutulan; ~ **clothes** bayırlıq geyim / paltar; **4.** müəssisənin divarlarından kənarda keçirilən; **the ~ agitation for reform** islahatların əhali arasında təbliğatı; ~ **pick-up** studiyadan kənar radio verilişi;

◊ ~ **hands** codlaşmış/cadar-cadar olmuş əllər *(havadan, küləkdən)*

**outdoors[1]** ['autdɔ:z] *n* küçə, həyət; bayır; *The outdoors lighted Bayırda hava açıldı;* **all** ~ bütün aləm, hər şey / yer

**outdoors[2]** ['autdɔ:z] *adv* açıq havada; bayırda, küçədə; *Let them go outdoors and play Qoy / Qoyun onlar küçəyə çıxıb oynasınlar*

**outdrive** [aut'draıv] *v* ötüb keçmək, qabaqlamaq, üstələmək, geridə qoymaq

**outer[1]** ['autəʳ] *n hərb.* **1.** hədəfin ağ rəngli hissəsi; **2.** hədəfin ağ rəngli hissəsinə dəymə

**outer[2]** ['autəʳ] *adj* **1.** bayır, çöl, üst; ~ **coverings** üst örtükləri; ~ **garments** üst geyimləri; ~ **space** kosmos, kainat; **2.** mərkəzdən uzaqda yerləşən; uzaq; ~ **London** Londonun ucqarları; ~ **suburbs** şəhərin ucqar ətrafları; **3.** *məc.* əşyavi, fiziki; ~ **world** ətraf mühit, dünya; **4.** *fəls.* obyektiv

**outermost** ['autəmoust] *adj* mərkəzdən ən uzaqda yerləşən, ən kənar

**outerwear** ['autəweəʳ] *n amer.* üst geyimi/paltarı

**outface** [aut'feıs] *v* **1.** diqqətli/iti baxışla utandırmaq; **2.** özünü həyasızcasına/yekəxana aparmaq, meydan oxumaq

**outfall** ['autfɔ:l] *n* **1.** çayın mənsəbi **2.** arx, yarğan; suyun axması üçün kiçik kanal; **3.** *dial.* dava-dalaş

**outfield** ['autfi:ld] *n* **1.** uzaq düzən/sahə/tarla; uzaqda yerləşən və qeyri-sistematik becərilən torpaq sahəsi; **2.** *məc.* tədqiq edilməmiş sahə; bir şeyin hüdudlarından kənarda olan sahə; **the great ~ of meanings** mənaların böyük və tədqiq edilməmiş sahəsi; **3.** *id.* meydançanın uzaqda olan sahəsi *(kriket oyununda)*; meydançanın uzaq sahəsində olan oyunçu

**outfight** [aut'faıt] *v* qalib gəlmək *(döyüşdə)*; hamıdan üstün vuruşmaq / mübarizə aparmaq

**outfit[1]** ['autfıt] *n* **1.** ləvazimat *(ekspedisiya, səyahət və s. üçün)*; ləvazimat xərcləri; **camping** ~ turist ləvazimatı; **sports** ~ idman ləvazimatı; **2.** geyim komplekti / dəsti *(ekspedisiya v ə s. üçün)*; forma; **a skiing** ~ xizəkdə sürüşmək üçün paltar dəsti; **3.** geyim, paltar, libas; *She did not wear the same outfit two days running O, bir paltarı iki gün dalbadal geyinmirdi; She bought a new outfit for her daughter's wedding O, qızının toyunda geyinmək üçün yeni paltar aldı;* **4.** narkotik maddələri istifadə etmək üçün narkomanların işlətdikləri qurğu; **5.** cihaz, avadanlıq, ləvazimatlar, alətlər/cihazlar toplusu; **carpenter's** ~ dülgər alətləri; **a bicycle repair** ~ velosiped təmir etmək üçün alətlər/ləvazimatlar; **6.** *d.d.* turist/ səyahətçilər/ekspedisiya qrupu; naxır otaran bir qrup kovboy *(Amerika çobanları)*; **7.** ansambl, qrup; *Some of the modern outfits don't have brass Bəzi müasir ansamblların tərkibində nəfəs alətləri yoxdur;* **8.** *hərb.* hərbi hissə/bölmə; *They are soldiers belonging to the same outfit Onlar bir hərbi bölmənin əsgərləridir;* **9.** təşkilat; müəssisə, firma, şirkət; *He's carrying this entire outfit on his shoulders O bütün təşkilatı öz çiynində aparır;* **a publishing** ~ nəşriyyat

**outfit[2]** ['autfıt] *v (pt, pp* **outfit***)* ləvazimat / avadanlıq vermək; təchiz/təmin etmək; **to ~ an expedition** ekspedisiyanı təchiz etmək

**outflank** [aut'flæŋk] *v* **1.** *hərb.* cinahdan əhatə etmək/ keçmək, düşmənin cinahına keçmək; **to ~ the main force** əsas qüvvələrin cinahına keçmək; **2.** *məc.* aldatmaq, hiylə işlətmək

**outflow[1]** [aut'flou] *n* axma; axıb getmə; axın; bir mayenin axıb getmiş miqdarı; **an ~ of bad language** söyüş yağdırma; ~ **of capital** kapitalın ölkədən aparılması/ çıxarılması/axını

**outflow[2]** ['autflou] *v* axmaq, axıb getmək

**outfox** [aut'fɔks] *v* aldatmaq, hiylə gəlmək

**outgiving[1]** ['aut.gıvıŋ] *n* **1.** ifadə, söylənilmiş fikir, bəyanat; **2.** ödəmələr, məxaric, xərclər

**outgiving[2]** ['aut.gıvıŋ] *adj* açıq, ürəyiaçıq, genişqəlbli, rəhmdil, rəhmli

**outgoing[1]** ['aut.gouıŋ] *n* **1.** gediş, yola düşmə; çıxış, istefaya getmə; **2.** xərclər; *Our outgoings are higher in winter Qış vaxtı bizim xərclər daha çox olur*

**outgoing[2]** ['aut.gouıŋ] *adj* **1.** gedən; yola düşən; tərk edən; istefaya gedən; **the ~ cabinet** istefaya gedən kabinet; ~ **governor** istefaya gedən qubernator; **2.** çıxan; göndərilən *(kağız, məktublar və s.)*; **3.** diqqətli, nəcib, yumşaq, rəhmdil; tez ünsiyyət tapan adam/insan; *Sales representatgve needs to be outgoing and dynamic Ticarət nümayəndəsi müştəri ilə tez dil tapan və fəal olmalıdır;* **4.** *tex.* emal olunmuş, istifadə olunmuş, təmizlənmiş

**outgrow** [.aut'grou] *v (pt* **outgrew** ['-.gru:]; *pp* **outgrown** [-'groun]*)* **1.** boyda ötüb keçmək; **2.** paltarı və s. əyninə artıq balaca olmaq; *My family has outgrown our house Evim böyümüş ailəm üçün artıq balacadır;* **3.** böyüdükcə pis adətlərdən imtina etmək/əl çəkmək/yaxa qurtarmaq

**outgrowth** ['autgrouθ] *n* **1.** böyümə; yekəlmə; genişlənmə; qol-budaq atma; **2.** şitil; zoğ, cavan budaq; **3.** şiş, ur, fır, törəmə; *Antlers are the bone outgrowths on the head of deer Buynuz maralın başında əmələ gəlmiş sümük törəmədir;* **4.** *məc.* təbii gediş, axın *(hadisələr və s.)*; nəticə; *Racism was not just an outgrowth of*

*Nazism but its basis Rasizm nasizmin nəticəsi deyil, onun əsası idi*

**outing** ['autɪŋ] *n* 1. şəhərkənarı gəzinti / ekskursiya; **to go for an** ~ şəhərkənarı gəzintiyə/ekskursiyaya yollanmaq / getmək; 2. çıxış, püskürmə; 3. dənizin üfüqə kimi görünən hissəsi

**outlandish** [aut'lændɪʃ] *adj* 1. xarici, əcnəbi, digər ölkəyə mənsub olan; 2. *məc.* qəribə; görünməmiş, əcaib; ~ **hairstyle** əcaib/qəribə saç düzümü; 3. ağlasığmaz, absurd, gülünc; ~ **idea** gülünc/absurd fikir/ideya; 4. tənha, yalnız; uzaq, ucqar *(yer haq.)*

**outlast** [aut'la:st] *v* 1. daha uzun çəkmək *(vaxt etibarı ilə)*; kimdənsə daha çox yaşamaq; daha uzun müddət tab gətirmək; *The business they set up outlasted them all Onların təməlini qoyduqları iş, onlardan çox yaşadı;* 2. yaşamaq, müəyyən müddət yaşamaq; *Flies don't outlast some days Milçəklər bir neçə gündən artıq yaşamırlar*

**outlaw**[1] ['autlɔ:] *n* 1. bandit, quldur, soyğunçu, talançı, yolkəsən; 2. qanuna zidd / qanundan kənar elan edilmiş təşkilat və yə şəxs; səfil, qaçaq; *Robin Hood was an outlaw Robin Hud qanundan kənar elan edilmiş şəxs idi;* 3. əhliləşdirilməmiş/vəhşi/ xam heyvan

**outlaw**[2] ['autlɔ:] *adj* 1. qanunsuz, qeyri-qanuni, qanundan kənar elan edilmiş; *He belongs to an outlaw terrorist group O, qeyri-qanuni elan edilmiş terrorist qruplaşmasına aiddir;* ~ **strike** həmkarlar ittifaqı ilə razılaşdırılmamış tətil; 2. əhliləşdirilməmiş, ələ öyrəşdirilməmiş, xam; ~ **horse** xam at

**outlaw**[3] ['autlɔ:] *v* 1. qeyri-qanuni elan etmək; ölkə ərazisindən xaric etmək; qanuna zidd elan etmək; yasaqlamaq, qadağan etmək; *Smoking is outlawed in public İctimai yerlərdə siqaret çəkmək qadağandır;* 2. qanuni qüvvəsini əlindən almaq; *The debt was outlawed by the statute of limitations İşləmə müddəti üzrə qanuna əsasən borc iltizamının hüquqi qüvvəsi ləğv edilmişdir*

**outlay**[1] ['autleɪ] *n* xərclər; ~ **on/for scientific research** elmi tədqiqatlara buraxılan xərclər; **capital** ~ əsas xərclər; **huge** ~ böyük / iri xərclər; **small/modest** ~ xırda/kiçik xərclər

**outlay**[2] ['autleɪ] *v (pt, pp* **outlaid** ['autleɪd]*)* 1. *şair.* açmaq, qarşıya qoymaq, sərgiləmək; 2. xərcləmək

**outlet** ['autlet] *n* 1. axıb getmə, axma; 2. giriş və ya çıxış dəliyi; buraxılış, çıxış; axıtma, su axıtma qurğusu; 3. *məc.* fürsət/imkan açılma *(bacarığı, qabiliyyəti göstərmək üçün)*; *He needed an outlet for that driving energy Ona enerjisini sərf etmək üçün bir imkan lazım idi;* 4. ticarət nöqtəsi/məntəqəsi; mağaza; ticarət / satış bazarı; *India is the most important outlet for British goods Hindistan İngiltərə üçün mallarının satışı baxımından ən vacib bazardır;* **retail** ~**s** pərakəndə satış / ticarət mərkəzi; 5. *tex.* ştepsel rozetkası; 6. otlaq, örüş; həyət, evin qarşısındakı çəmənlik; evin ətrafındakı hər hansı çəpərlənmiş sahə;

◊ **oil** ~ yağ axıtma; yağ axıdılan dəlik; ~ **to the sea** dənizə çıxış; *This lake is like the Caspian Sea, receiving all, and having no outlet Bu göl Xəzər dənizi kimi bütün suları qəbul edir, lakin ondan heç bir çıxış yoxdur*

**outlier** ['aut,laɪəʳ] *n* 1. hər hansı hüdudlardan kənarda olan bir kəs / bir şey; *The party sent messengers to all their outliers within twenty miles of Cambridge Partiya Kembricdən 20 mil aralıda yaşayan üzvlərinin hamısına qasid göndərdi;* 2. əsas hissədən ayrılmış/qopmuş bir şey; *Australia remains an isolated outlier of Asia to the present day Avstraliya indiyə kimi Asiyadan ayrılmış bir hissə olaraq qalmaqdadır;* 3. *məc.* vəzifə borcuna görə öz yerində yaşamayan adam *(məs., kazarmada gecələməyən əsgər)*; 4. kənar şəxs, özgə; 5. qaya parçası

**outline**[1] ['autlaɪn] *n* 1. ümumi şəkil; kontur; çevrə; 2. eskiz, ilkin rəsm; **to draw up an** ~, **to make an** ~ eskiz çəkmək; **bare/broad/general /rough** ~ təxmini eskiz; 3. konspekt, plan, sxem; qısa məzmun; 4. əsas müddəalar/prinsiplər; əsas ideya

**outline**[2] ['autlaɪn] *v* 1. konturunu çəkmək; xətləmək; 2. *məc.* təsvir etmək, ümumi cizgilərlə göstərmək; *She outlined what I would be doing O, mənim nə edəcəyimi ümumi şəkildə izah etdi*

**outlive** [aut'lɪv] *v* 1. çox yaşamaq, ömrü uzun olmaq; öz üzərində hiss etmək; **to ~ *one's* capacity** gücsüz olmaq, iqtidarını itirmək; *He is sure not to outlive these three days Yəqin ki, o, üç gündən artıq yaşamayacaq; The world has outlived much, and will outlive a great deal more Dünya çox şey yola salıb, və bundan sonra da daha çox şey yola salacaq;* 2. sağ qalmaq; 3. dözmək, tab gətirmək; **to ~ the disgrace** rüsvayçılığa dözmək

**outlook** ['autluk] *n* 1. daimi müşahidə; **on the** ~ pusquda; 2. diqqətlilik, sayıqlıq, ehtiyatlılıq; *They had a sharp expression of outlook and readiness Onların sifəti sayıqlıq və hərəkətə hazırlıq ifadə edirdi;* 3. müşahidə punktu / nöqtəsi; 4. görünüş, görkəm, mənzərə; **dismal / gloomy** ~ tutqun görkəm / mənzərə; *There was a picturesque outlook on all sides Hər tərəfdə gözoxşayan mənzərə var idi;* 5. **(for)** perspektiv, gələcək planlar; *The outlook for the future is bright Gələcək gözəl görünür;* **long-range** ~, **long-term** ~ uzunmüddətli perspektivlər; **short-range** ~, **short-term** ~ qısamüddətli perspektivlər; 6. dünyagörüşü; ümumi biliklər; qavrayış, baxış; **to have an** ~ **on** dünyagörüşünə malik olmaq; **healthy** ~ sağlam qavrayış; **negative / pessimistic** ~ neqativ / bədbin dünyagörüşü; **optimistic / positive** ~ **on life** həyata nikbin / pozitiv baxış; *She has a healthy outlook on life O, dünyaya nikbinliklə baxır*



**outlying** ['aut,laɪɪŋ] *adj* 1. uzaq, ucqar; uzaqda olan; ~ **district** ucqar rayon; 2. bir şeyin hüdudlarından kənar olan; 3. *məc.* özgə, xarici

**outness** ['autnɪs] *n* 1. ətraf mühit, xarici mühit; xarici tərəf; 2. mülahizə, fikir, rəy

**outnumber** [aut'nʌmbəʳ] *v* sayca üstün olmaq; *He was besieging an army far outnumbering his own O, öz ordusundan sayca çox üstün olan ordunu mühasirədə saxlayırdı*

**outpour**[1] ['autpɔ:ʳ] *n* 1. axın; 2. daşma; 3. hisslərin izhar edilməsi

**outpour**[2] ['autpɔ:ʳ] *v* 1. axıtmaq, tökmək; 2. ürəyini açmaq / boşaltmaq, hissləri izhar etmək; *She was not of those whose sorrow outpours in complaints O, hüznünü / kədərini ah-zarla izhar edən insanlardan deyildi*

**output**[1] ['autput] *n* 1. məhsul, mal; **to increase / to step up** ~ mal buraxılışını artırmaq; **to curtail / to cut back / to reduce** ~ mal buraxılışını azaltmaq; **manufacturing** ~ emal sənayesi məhsulu; **gross** ~ ümumi məhsul; *Much of her output as a writer was first published in magazines Onun ilk əsərlərindən bir çoxu əvvəlcə jurnallarda dərc edilmişdi;* 2. buraxılış, məhsul istehsalı; hasilat; **annual** ~ istehsalın illik həcmi, illik istehsal; **industrial** ~ sənaye istehsalının həcmi; **daily** ~ gündəlik istehsal; ~ **per worker** fərdi istehsal, bir fəhləyə düşən istehsal həcmi; 3. *tex.* məhsuldarlıq; iş həcmi; buraxılış əmsalı / həcmi / imkanı; **average** ~ orta məhsuldarlıq; 4. *riyaz.* nəticə; 5. çıxış qurğusu *(kompüterdə)*

**output**[2] ['autput] *adj* 1. buraxılan, istehsal edilən; ~ **goods** buraxılan mallar / məhsul; 2. çıxış, çıxışla / çıxış qurğusu ilə bağlı olan; ~ **information** çıxış məlumatı; ~ **error** çıxış zamanı səhv, çıxış vahidinin səhvi

**outrage**[1] ['autreɪdʒ] *n* 1. ciddi pozuntu *(qanun, digərinin hüquqları, ədəb qaydaları və s. haq.)*; özbaşınalıq; 2. vəhşilik, cinayət, zorakılıq aktı / hərəkəti; kobud güc / zor işlətmə; *It was an outrage to take innocent civilians hostage Günahsız əhalini girov götürmək ictimai vəhşilik idi; It was the worst of a series of terrorist outrages Bu terror aktı bir sıra terror aktlarından ən dəhşətlisi idi;* 3. narazılıq, qəzəb; təhqir; **to provoke public** ~ ictimaiyyətdə narazılıq oyatmaq; **to express** ~ narazılıq ifadə etmək; **to feel** ~ təhqir olunmaq; **to spark / to spark off / to stir up** ~ təhqir etmək; **an** ~ **against public morality** ictimai mənəviyyatın təhqir edilməsi; *It was an outrage that her name was omitted Onun yada salınmaması təhqir idi;* 4. *d.d.* biabırçı / təhqiramiz hal / hadisə / hərəkət; *It is an outrage that so much public money has been wasted in this way Bu miqdarda ictimai pulların əbəs yerə xərclənməsi biabırçılıqdır*

**outrage**[2] ['autreɪdʒ] *v* 1. qanunu kobud şəkildə pozmaq; 2. zorakılıq işlətmək; 3. qəzəbləndirmək, hiddətləndirmək, cin atına mindirmək; təhqir etmək; **to ~ public opinion** ictimai rəyi təhqir etmək; *A crowd of people was outraged at/by the way of police officers were hitting a man Bir qrup insan polis işçisinin bir adamı döyməsindən hiddətlənmişdi*

**outrageous** [aut'reɪdʒəs] *adj* 1. amansız, qəddar; 2. hiddətləndirici; təhqiredici; görünməmiş, biabırçı; *It's outrageous to permit such behaviour Belə bir davranışa/hərəkətə yol vermək təhqiredici haldır; It's outrageous that such practices are allowed Bu cür fırıldaqlara icazə vermək biabırçılıqdır*

**outrange** [aut'reɪndʒ] *v* 1. *hərb.* yüksək uzaqvurma imkanına malik olmaq; 2. ötüb keçmək, ötmək *(yarış zamanı gəmini)*; 3. sayca üstün olmaq *(idman komandası haq.)*

**outre** ['u:treɪ] *adj fr.* 1. ekssentrik, qəribə, qeyri-adi, hamıdan seçilən *(geyimi, görünüşü ilə)*; ~ **garb** əcaib geyim / libas; 2. *məc.* şişirdilmiş

**outright**[1] ['autraɪt] *adj* 1. tam, tamam, bitmiş, mükəmməl; **an** ~ **scoundrel** tamam yaramaz / əclaf; *They demand the outright and immediate abolition of the tax on children's clothes Onlar uşaq geyiminə qoyulan verginin tam və dərhal ləğvini tələb edirlər;* **to be the** ~ **winner** tam qələbəyə nail olmaq / qələbə çalmaq; 2. qəti, dönməz; ~ **condemnation** qəti şəkildə pisləmə; ~ **refusal** qəti imtina; 3. açıq, açıq-aşkar, birbaşa; doğru; ~ **hostility** açıq-aşkar düşmənçilik; 4. təxirə salınmaz

**outright**[2] ['autraɪt] *adv* 1. tam, tam şəkildə; axıra kimi / qədər; 2. açıq-aşkar, birbaşa, gizlətmədən; 3. o saat, ləngimədən, həmən, dərhal, o andaca; *Cigarette advertising should be banned outright Siqaretlərin reklam edilməsi dərhal dayandırılmalıdır*

**outrun** ['aut'rʌn] *v (pt* **outran** ['-'ræn], *pp* **outrun***)* 1. ötüb keçmək, arxada qoymaq, qabaqlamaq, üstələmək; *Demand for metals like tungsten will outrun supply Volfram kimi metala olan tələbat yaxın zamanlarda onun təklifini ötüb keçəcək; Costs outran her income Xərcləri onun gəlirindən çox idi;* 2. çəkinmək; yaxa qurtarmaq; yarmaq, yarıb çıxmaq; *The U-boat outran the blockade Sualtı gəmi blokadanı yardı/yarıb çıxdı*

**outset** ['autset] *n* 1. əvvəl, başlanğıc, təməl; yenilik; **at the ~ of a play** pyesin başlanğıcında; *A good outset is half the voyage Yola uğurla başlamaq onun yarısını keçmək deməkdir; This money will be an outset for your business Bu*

*pullar sənin biznesin üçün təməl olacaqdır;* **at the ~** başlanğıcda; **from the ~** lap əvvəldən / başlanğıcdan; 2. *poliqr.* dərkənar; vərəqin qıraqlarında yazılmış başlıq; əlavə vərəq *(kitabın içinə qoyulan)*

**outshine** [,aut'ʃaın] *v (pt, pp* **outshone** [-'ʃɔn]) 1. *məc.* kölgədə qoymaq, üstələmək *(parıltıda, zənginlikdə və s.)*; 2. daha çox parıldamaq/parlamaq

**outside**[1] [,aut'saıd] *n* 1. bir şeyin xarici / bayır tərəfi; *The outside of the house needs painting Ev bayır tərəfdən rənglənməlidir;* **on the ~** bayırdan, bayırda; 2. xarici görünüş; *Don't judge a thing from the outside Bir şeyə xarici görünüşə görə qiymət vermə / verməyin;* **rough ~** kobud / qaba xarici görünüş; 3. ətraf dünya / mühit; 4. *d.d.* azadlıq *(məhbuslar üçün)*; 5. qitənin içərilərində əhali yaşamayan yerlər *(Avstraliyada)*; 6. maksimum, ən çox sayda; **at the very ~** ən çoxu, maksimum; lap çətin məqamda/halda; 7. altdan və üstdən qoyulmuş vərəqlər *(kağız bağlamasında)*

**outside**[2] ['autsaıd] *adj* 1. xarici, bayır, xaricdə / bayırda yerləşən; **~ edge** bayır kənarı/ucu/ həddi; **~ measurements** xarici / bayır ölçülər; **~ work** bayırda görülən iş; **~ broadcast** studiyadankənar radio verilişi; 2. cinahdakı, cinah, axırıncı, kənar; **~ left** *id.* sol cinah / kənar hücumçusu; **~ right** *id.* sağ cinah/kənar hücumçusu; 3. xarici; özgə; kənar; **~ expert** kənardan dəvət edilmiş mütəxəssis; **~ help** xaricdən alınan kömək; 4. maksimal, ən böyük, son həddə olan; **~ limit** ən son hədd; **~ prices** ən yuxarı qiymətlər; 5. cüzi, çox az; **~ chance** cüzi şans/imkan; **to have ~ chance of winning** qalib gəlmək üçün az şansı olmaq

**outside**[3] [,aut'saıd] *adv* çöldən, bayırdan, bayırda, kənardan, xaricdən; bayıra, çölə; **to go ~** bayıra / çölə çıxmaq; *Children are playing outside Uşaqlar bayırda oynayırlar*

**outside**[4] [,aut'saıd] *prep* 1. xaricdə, kənarda, bayırda; -da, -də; *Somebody is standing outside the door Kimsə qapının bayırında durur;* **~ the house** bayırda; 2. başqa, istisna olmaqla; *He has no occupation outside his office work Onun ofis işindən başqa işi yoxdur*

**outsider** [,aut'saıdəʳ] *n* 1. bayırda / divar arxasında olan bir kəs və ya bir şey; kənar şəxs; qrupa aid olmayan şəxs; özgə, yad; *Few outsiders have ever visited this tribe Bu qəbiləni yalnız bir neçə özgə adam ziyarət etmişdi; As a child she was very much an outsider Uşaq ikən o özünü digər uşaqların yanında yad hiss edirdi;* 2. *məc.* qeyri-mütəxəssis, səriştəsiz/ peşəkar olmayan adam; bixəbər dairələr; bixəbər insanlar; 3. *iqt.* autsayder *(inhisarçı birliyə daxil olmayan müəssisə)*; 4. *id.* autsayder *(qələbəyə şansı az olan)*; *The race was won by a rank outsider Cıdırda autsayder sayılan at qalib gəldi*

**outsit** [aut'sıt] *v (pt, pp* **outsat** ['-sæt]) məclisdə digər qonaqlardan çox oturmaq *(vaxt etibarı ilə)*; gec qalmaq; *We outsat the twilight, drawing from the rich stories of the old statesman Qoca siyasətçinin maraqlı hekayələri bizi cəlb etdiyindən dan yeri sökülənə kimi oturduq*

**outsize** ['autsaız] *adj* qeyri-adi dərəcədə böyük / iri; standart ölçülərdən böyük, qeyri-standart

**outskirts** ['autskə:ts] *n* 1. ətraf, kənar; **~ of town** şəhərin ətrafı / kənarı; 2. meşə kənarı; ətək *(dağda)*

**outspeak** [aut'spi:k] *v (pt* **outspoke**[-'spouk]; *pp* **outspoken** [-'spoukn]) 1. bir kəsdən daha yaxşı / ifadəli / hündürdən danışmaq; 2. bəyan / ifadə etmək

**outspread**[1] ['aut'spred] *n* 1. yayılma; genişlənmə, açılma; 2. sahə; **wide ~s of the vineyards** geniş üzüm sahələri

**outspread**[2] ['aut'spred] *adj* yayılmış, açılmış, uzanmış, uzanan; **~ arms** açılmış əllər *(yanlara)*

**outspread**[3] ['aut'spred] *v (pt, pp* **outspread**) 1. yayılmaq; 2. uzanıb getmək; 3. açmaq *(eninə, yanlara)*; *The eagle is outspreading his wings for flight Qartal uçmaq üçün qanadlarını yanlara açır*

**outstanding** [aut'stændıŋ] *adj* 1. görkəmli, məşhur, tanınmış; **an ~ writer**; məşhur yazıçı; **an ~ novel** tanınmış/ məşhur roman; *The prize is awarded for "an outstanding contribution to science" Mükafat "elmin inkişafındakı görkəmli nailiyyətlərə" görə verilir;* 2. çıxan *(qabağa, yana və s.)*; sallanan; 3. *məc.* irəlidən gələn, gələcək, olacaq; yerinə yetirilməmiş, həll edilməmiş; **~ works** qarşıda duran işlər; *There are some problems still outstanding Hələ də qarşıda həll edilməmiş problemlər vardır;* 4. ödənilməmiş; vaxtı keçmiş; **~ debt** ödənilməmiş borc; **~ loan** ödənilməmiş istiqraz

**outstep** [aut'step] *v* həddi keçmək / aşmaq; hüdudları aşmaq, hüdudlardan kənara çıxmaq

**outturn** ['aut'tə:n] *n* 1. məhsuldarlıq; 2. imkan, güc; 3. həqiqi nəticələr; 4. planın yerinə yetirilməsi

**outward**[1] ['autwəd] *n* 1. xarici görünüş; bayır tərəf, içəri tərəf; 2. xarici aləm, ətraf mühit

**outward**[2] ['autwəd] *adj* 1. xarici, bayır; səthi; *The outward appearance of the building has not changed at all in 200 years Binanın xarici görünüşü 200 il ərzində əsla/heç dəyişməmişdir;* **~ form** xarici görünüş; **~ things** ətraf aləm; 2. açıq-aşkar, aydın; üzdə olan; *If he is suffering, he certainly shows no outward sign of it O əziyyət çəksə də, bunu açıq şəkildə büruzə vermir;* 3. süni, yalançı, zahiri; qəsdən; **~ behaviour** qəsdən nəzərə çatdırılan davranış; *To all outward appearances everything was fine, but under the surface the marriage was very shaky Bütün zahiri əlamətlərə görə hər şey əla idi, lakin daxilən sezilirdi ki, izdivac çox davamsızdı;*



◊ **the ~ man** 1) bədən, vücud; 2) *d.d.* geyim, libas

**outward**[3] ['autwəd] *adv* 1. bayıra; kənara; hüdudlardan kənara; *The door opens outward Qapı bayıra açılır;* **~ bound** yola düşməli *(gəmi)*; xaricə gedən *(gəmi)*; **to direct one's emotions ~** emosiyalarını / hisslərini üzə çıxarmaq / büruzə vermək; 2. *amer.* çox güman *(ki)*; görünür *(ki)*; açıq-aşkar, açıqcasına

**outwardly** ['autwədlı] *adv* xaricdən, bayırdan, kənar-dan; *The country was outwardly quiet Kənardan baxanda ölkə sakit görünürdü*

**outwardness** ['autwədnıs] *n* 1. obyektiv mövcud olma; 2. dünyanın maddiliyini qəbul etmə

**outwards** ['autwədz] *adv* bayıra, xaricə, hüdudlardan kənara

**outwear** ['autweəʳ] *v (pt* **outwore** [ -wɔ:ʳ]; *pp* **outworn** [-wɔ:n]) 1. çox geyinmək, nimdaş hala salmaq *(geyimi, ayaqqabını, papağı və .s)*; **to ~ new clothes too quickly** təzə geyimi çox tez nimdaş hala salmaq; 2. xərcləmək; sərf etmək; 3. *məc.* öldürmək *(vaxtı)*; 4. tükətmək *(gücü, qüvvəni, ərzağı və s.)*; 5. möhkəm/davamlı olmaq *(paltar və s.)*; *This cloth will outwear than that one Bu parça o birindən daha möhkəm/davamlı olacaq*

**outweigh** [aut'weı] *v* 1. daha ağır olmaq *(çəkidə)*; 2. üstün gəlmək/olmaq, güclü çıxmaq; hörməti və çəkisinə görə daha üstün olmaq; *His hate will outweigh my love Onun nifrəti mənim məhəbbətimə üstün gələcək*

**outwit** [aut'wıt] *v* aldatmaq, tora salmaq

**outwork**[1] ['autwə:k] *n* 1. emalatxanadan/zavoddan kənar iş; evə götürülən / evdə görülən iş; 2. *hərb.* xarici istehkam

**outwork**[2] ['autwə:k] *v* 1. daha yaxşı/daha tez işləmək 2. bir işi axıra qədər görmək/görüb qurtarmaq

**outworker** ['aut,wə:kəʳ] *n* evdə işləyən işçi *(kişi, qadın)*

**outworn** ['autwɔ:n] *adj* 1. nimdaş, istifadə üçün yararsız; 2. *məc.* köhnəlmiş *(fikirlər, nəzər nöqtəsi, anlayışlar)*; **~ quotations** çox işlənmiş sitatlar; 3. həddən artıq yorğun, əldən düşmüş

**ouzel** ['u:zl] *n zool.* qaratoyuq

**oval**[1] ['ouvl] *n* oval

**oval**[2] ['ouvl] *adj* oval şəkilli; yumurtavari, yumurtaşəkilli, yumurtayaoxşar; elliptik; **~ window** oval şəkilli pəncərə; **~ Office** Ağ Evdə Prezidentin otağı

**ovality** [ə'vælıtı] *n* ovallıq

**ovary** ['ouvərı] *n* 1. *anat.* yumurtalıq; 2. *bot.* toxumluq

**ovation** [ou'veıʃn] *n* alqışlar, əl çalma, sürəkli alqışlar; **to get / to receive an ~** sürəkli alqış qazanmaq; sürəkli alqışa layiq olmaq; **standing ~** ayaqüstə davamlı / sürəkli alqışlar; **thunderous ~** uzunsürən / güclü alqışlar; *They walked out on the stage to a thunderous ovation Onlar sürəkli alqışlara cavab olaraq səhnəyə çıxdılar*

**oven** ['ʌvn] *n* duxovka, peç; **electric ~** elektrik duxovkası/ peçi; **gas ~** qaz peçi; **microwave ~** mikrodalğalı peç; **to light an ~, to turn on an ~** duxovkanı / peçi yandırmaq; **to turn off an ~** duxovkanı / peçi söndürmək;

**over**[1] ['ouvəʳ] *n* 1. artıq; əlavə pul / ödəniş; 2. *hərb.* mərminin hədəfdən arxa tərəfə düşməsi; 3. *radio.* qəbula keçmə

**over**[2] ['ouvəʳ] *adj* 1. yuxarı; 2. daha yüksək rütbəli; 3. artıq; əlavə; 4. bitmiş, qurtarmış, keçmiş; **after the war was ~** müharibə bitəndən / qurtarandan sonra

**over**[3] ['ouvəʳ] *adv* 1. *Bir əşyanın üstündən aşıb keçmək mənasına işarə edir:* **to jump ~** üstündən hoppanmaq; 2. *Üstündə yerləşməyə işarə edir:* **to hang ~ head** baş üstündə asılı olmaq; 3. *Əks istiqamətə / tərəfə keçməyə işarə edir:* **to sail / to swim ~** o biri tərəfə / sahilə / taya üzüb keçmək *(çayı, gölü və s.)*; 4. *Hər hansı bir tərəfdə olmağa işarə edir:* **~ by the hill** təpənin o tərəfində/ arxasında; 5. *Yenidən / Bir daha təkrara işarə edir:* **to do** *smth.* **~** bir şeyi yenidən etmək; 6. *İşin / Hərəkətin sona çatdırılmasına, həmçinin onun dəqiqliklə yerinə yetirilməsinə işarə edir:* **to think** *smth.* **~** bir şey haqqında yaxşı-yaxşı / dəqiq fikirləşmək , bir şeyi götür-qoy etmək; 7. *Hərəkətin bitməsinə işarə edir: The lesson is over Dərs bitdi / qurtardı / sona çatdı;* 8. *Hərəkətin hər yerə yayılmasına işarə edir: He ached all over Onun hər yeri ağrıyırdı;* 9. *Hər hansı prosesin müəyyən vaxt ərzində uzun müddət davam etməsinə işarə edir:* **~ until Sunday** bazar gününə kimi / qədər; 10. *Bir şeyin bir kəsdən digərinə ötürülməsinə işarə edir:* **to make a property ~ to** *smb.* əmlakı bir kəsə vermək

**over**[4] ['ouvəʳ] *prep Azərbaycan türkcəsinə çıxışlıq hal şəkilçisi* (**-dən**) *və yerlik hal şəkilçiləri* (**-da, -də**), *və* **-la, -lə** *şəkilçiləri vasitəsilə tərcümə olunur. Aşağıdakı mənaları ifadə edir:* 1) *Bir əşyanın üstündə olmağı və ya hərəkət etməyini bildirir;* **a flight ~ the sea** dənizin üstündən uçuş; 2) *bir əşyanın üstündə olma vəziyyətini bildirir; His hand was over his heart Onun əli ürəyinin üstündə idi;* 3) *bir şeyin üstündən keçmə mənasını bildirir:* **a new bridge ~ a river** çay üstündən yeni körpü; 4) *bir şeyin hər hansı yolla / vasitə ilə ötürülməsinə / göndərilməsinə / yola salınmasına işarə edir:* **~ the telephone** telefonla; 5) *bir şeyin o tayında / arxasında olma mənasını bildirir:* **~ the river** çayın o tayında / tərəfində; 6) *bir şeyin yaxınlığında olma mənasını bildirir:* **to be ~ the fire** ocağın yanında olmaq; 7) *paltarın geyilməsi / üzlüyün və s. taxılmasına işarə edir:* **to put an apron ~ the dress** paltarın üstündən önlük geyinmək; 8) *daha yüksək rütbə, vəzifə, yaş, haki-*

*miyyət və s. işarə edir:* **to rule ~ *smth.*** bir şeyin üzərində ağalıq etmək, bir şeyi idarə etmək; **9)** *Hərəkətin baş vermə müddətinə işarə edir:* **~ the last three years** axırıncı üç il ərzində; **10)** *Mübahisənin, müzakirənin predmetinə işarə edir:* **to dispute ~ *smth.*** bir şey haqda / barəsində mübahisə etmək

**overage[1]** ['ouvə'reɪdʒ] *n* artıq, əlavə *(mal və s.)*

**overage[2]** ['ouvə'reɪdʒ] *adj* **1.** köhnəlmiş, nimdaş; **2.** yaşı keçmiş; çox yetişmiş; **3.** artıq, əlavə; *An overage of goods was disclosed Artıq mal aşkar edilmişdi*

**overall[1]** ['ouvərɔ:l] *n* iş xalatı, xüsusi geyim; enli iş şalvarı, kombinezon

**overall[2]** ['ouvərɔ:l] *adj* **1.** tam, ümumi, əvvəldən axıra kimi; **~ dimensions** qabaritlər, ümumi ölçü; **2.** ümumi, hərtərəfli, tam, cəm; qlobal; **~ effect** ümumi effekt; *The overall situation is good Ümumi vəziyyət yaxşıdır;* **3.** *id.* tam və mütləq, yeganə; **~ winner** *müxtəlif idman növləri üzrə tam və mütləq qalib; She is the overall commander of three divisions O, üç diviziyanın yeganə komandiridir*

**overall[3]** ['ouvərɔ:l] *adv* **1.** hər yerdə, hara baxsan; **2.** tamamilə, ümumən, ümumilikdə, tam şəkildə; *Overall it was a really good week Ümumən bu yaxşı həftə idi*

**overarm** ['ouvəra:m] *n id.* **1.** yuxarıdan vurulan zərbə; **2.** overarm *(əlin arxadan baş üstündən irəli atılması ilə icra edilən üzmə növü)*

**overawe** [,ouvər'ɔ:] *v* bərk qorxu içərisində saxlamaq; bərk qorxu hissi yaratmaq; **to ~ the mutinous people** qiyam qaldırmış xalqı bərk qorxu içərisində saxlamaq

**overbalance[1]** [,ouvə'bæləns] *n* **1.** ağırlığın çox olması, ağır gəlmə; artıqlıq; **2.** *məc.* üstünlük

**overbalance[2]** [,ouvə'bæləns] *v* **1.** ağır olmaq, çəkidə üstün gəlmək; **2.** *məc.* üstün gəlmək, güclü olmaq; **3.** müvazinəti pozmaq; müvazinəti itirmək; aşmaq; *Halfway along the wall he overbalanceed and fell Divar üstü ilə gedəndə o, yarı yolda müvazinətini itirdi və yıxıldı*

**overbear** [,ouvə'beəʳ] *v (pt* **overbore** [-bɔ:ʳ]; *pp* **overborn** [-bɔ:n]) **1.** üstün/güc gəlmək; darmadağın etmək, dağıtmaq, əzmək, müqavimətini qırmaq/sındırmaq; *A wild wave overbears the ship Güclü dalğa gəmini dağıdır;* **2.** üstün olmaq, çox olmaq; **3.** həddən artıq çox bar vermək; *It is a great mistake to allow pear trees to overbear Armud ağaclarının çox bar verməsinə imkan vermək böyük səhvdir*

**overblow** ['ouvə'blou] *v (pt* **overblew** ['-blu:]; *pp* **overblown** ['-bloun]*)* **1.** şişirtmək, böyütmək; **2.** əsib/keçib getmək, sovuşmaq *(boran, tufan, təhlükə və s. haq.);* **3.** sovurmaq, uçurtmaq *(külək haq.);* **4.** səpmək, basmaq; *The sand has overblown many hundred acres of land Yüzlərlə akr (0,4 hektar) torpaq sahəsini qum basıb*

**overboard** ['ouvəbɔ:d] *adv* bortdan kənarda / kənara; **to throw ~** bortdan kənara tullamaq; *He fell overboard and was drowned O, bortdan aşdı və boğuldu;*

◊ **to throw *smb.* ~** bir kəsə dəstək verməyi dayandırmaq; **to go ~** ağ eləmək

**overboil** ['ouvə'bɔɪl] *v* **1.** həddən artıq qaynamaq / qaynatmaq; **2.** *d.d.* daşmaq *(süd və s. haq.)*

**overbold** ['ouvə'bould] *adj* **1.** həddən artıq cəsarətli / ötkəm; **2.** ehtiyatsız, diqqətsiz, başısoyuq

**overbuild** ['ouvə'bɪld] *v (pt, pp* **overbuilt** ['-'bɪlt]*)*: **1.** bir tikilinin üstünü örtmək, tikib qurtarmaq, tikib axıra çıxarmaq; **2.** *məc.* formalaşdırmaq; *Some men overbuild their nature with books Bəzi insanlar özlərini kitablar vasitəsi ilə formalaşdırır;* **3.** həddən artıq çox bina və s. tikmək

**overburden** [,ouvə'bə:dn] *v* **1.** həddən artıq yükləmək; **2.** ağırlaşdırmaq, çətinləşdirmək, müşkül etmək; **to ~ an essay with comments** oçerki qeydlərlə doldurmaq/ağırlaşdırmaq

**overcast[1]** ['ouvəka:st] *n* **1.** tam buludluluq, buludla örtülmüş səma; **2.** geyim biçimindən kənara çıxmış tikiş

**overcast[2]** ['ouvəka:st] *adj* **1.** buludlu; qaranlıq, tutqun; *It was a depressing overcast winter morning Cansıxıcı, tutqun bir qış səhəri idi;* **2.** *məc.* qəmli, kədərli, cansıxıcı

**overcast[3]** ['ouvəka:st] *v (pt, pp* **overcast***)* zülmətə/qaranlığa qərq etmək/olmaq; tutqunlaşdırmaq, tutqunlaşmaq; *Clouds overcast the sky Buludlar səmanı örtdü*

**overcharge[1]** ['ouvə'tʃa:dʒ] *n* **1.** həddən artıq yüklənmə; **2.** artıq alınmış pul; əlavə ödəniş; **3.** yenidən doldurma *(silahı, batareyanı və s.)*

**overcharge[2]** ['ouvə'tʃa:dʒ] *v* **1.** həddən artıq yükləmək; **2.** *hərb.* gücləndirilmiş güllə ilə silahı doldurmaq; **3.** *məc.* şişirtmək, mübaliğə etmək, sözü bəzəmək; fikri detallarla doldurmaq; *This account may be rather overcharged Ola bilsin ki, bu hesabat şişirdilib;* **4.** yüksək qiymət demək; artıq / əlavə pul almaq/götürmək; *The Company have overcharged fifteen shillings on the carriage of the goods Şirkət malın çatdırılması üçün əlavə 15 şillinq aldı;* **5.** yenidən / təkrar doldurmaq *(silahı, batareyanı və s.)*

**overcloud** [,ouvə'klaud] *v* **1.** buludla örtmək / örtülmək; **2.** qanı qaralmaq, qanını qaraltmaq, qəmginləşmək, qəmginləşdirmək; tutqunlaşmaq, tutqunlaşdırmaq; *The passing thoughts of evil overcloud his soul Köhnə qara fikirlər onu qəmləndirir*

**overcoat** ['ouvəkout] *n* **1.** palto; **2.** *hərb.* şinel;

◊ **wooden ~** tabut

**overcome** [,ouvə'kʌm] *v (pt* **overcame** ['-keɪm]; *pp* **overcome***)* **1.** üstün gəlmək, qalib gəlmək, dəf etmək; dözmək, tab gətirmək; öhdəsindən



gəlmək; boğmaq *(hissi və s.);* **to ~ temptation** nəfsin / tamahın qarşısında tab gətirmək, nəfsini basmaq; **to ~ obstacles** maneələri aşmaq / dəf etmək; *She managed to overcome her shyness O öz utancaqlığına qalib gələ bildi; We shall overcome Biz qalib gələcəyik;* **2.** çulğamaq, əhatə etmək, qapılmaq, aşıb-daşmaq *(hislər və s. haq.); I was overcome with grief and rage Məni qəm və qəzəb hissi bürümüşdü / çulğamışdı;* **3.** *Adətən məchul növdə işlənir:* üzmək, halsızlaşdırmaq, zəiflətmək; möhkəm yormaq, əldən salmaq; **to be ~ by thirst** susuzluqdan əldən düşmək/üzülmək; *Many people were overcome by fumes from the burning factory Çox adam yanan fabrikin/zavodun tüstüsündən zəhərlənmişdi*

**overcomplicate** ['ouvə'kɔmplɪkeɪt] *v* həddən artıq qəlizləşdirmək/çətinləşdirmək/mürəkkəbləşdirmək; *You're overcomplicating the whole thing Sən/Siz hər şeyi həddən artıq mürəkkəbləşdirirsən / mürəkkəbləşdirirsiniz*

**overcrow** [,ouvə'krou] *v* qələbəni bayram etmək *(düşmən və s. üzərində);* gücdə üstün gəlmək

**overcrowd** [,ouvə'kraud] *v* **1.** otağı, meydanı və s. adamlarla doldurmaq; *The hospitals are overcrowded Xəstəxanalar ağzına kimi doludur;* **2.** bir yerə yığışmaq / toplaşmaq

**overcrowded** [,ouvə'kraudɪd] *adj* basabas, ağzına kimi dolmuş; **to live in ~ conditions** darısqallıqda yaşamaq; **~ mind** həddən artıq yüklənmiş zəka/beyin; **~ cities** əhali ilə dolu şəhərlər

**overdo** [,ouvə'du:] *v (pt* **overdid** [-'dɪd]; *pp* **overdone** [-'dʌn]*)* **1.** həddən artıq səylə işləmək; tələb olunandan çox səy göstərmək / əziyyət çəkmək; **2.** cızıqdan çıxmaq, ağ eləmək; **3.** *d.d.* şişirtmək, mübaliğə etmək; *Rumours have been overdone Şayiələr şişirdilmişdi;* **4.** çox yormaq / üzmək / yükləmək; *After a heart attack you have to be careful not to overdo it / things Ürək tutmasından sonra sən/siz, çox işləməməlisən / işləməməlisiniz;* **5.** çox qızartmaq / bişirmək; *Vegetables have been overdone Tərəvəzlər çox bişirilib*

**overdone** [,ouvə'dʌn] *adj* **1.** şişirdilmiş, mübaliğə edilmiş; **2.** çox qızardılmış/bişirilmiş, ötmüş

**overdose[1]** ['ouvədous] *n* çox böyük doza; **fatal ~** öldürücü doza

**overdose[2]** ['ouvədous] *v* böyük doza vermək, böyük doza qəbul etmək

**overdressed** [,ouvə'drest] *adj* həddən artıq təmtəraqlı geyinmiş

**overdrink** ['ouvə'drɪŋk] *v (pt* **overdrank** [-'dræŋk]; *pp* **overdrunk** [-'drʌŋk]*)* həddən artıq içmək; digərindən daha çox içmək; *Many of us overeat, overdrink, and oversmoke Bizlərdən bir çoxu həddən artıq çox yeyir, içir və siqaret çəkirik*

**overdrive** ['ouvə'draɪv] *v (pt* **overdrove** [-'drouv]; *pp* **overdriven** [-'drɪvn]*)* **1.** yormaq, əldən salmaq, üzmək, halsızlaşdırmaq; **2.** çox sürmək, əldən salmaq, yormaq *(atı)*; **3.** çox sürətlə hərəkət etmək *(maşınla)*

**overdue** ['ouvə'dju:] *adj* **1.** gecikmiş, gec qalmış; *The train is overdue Qatar gecikir;* **it is long ~** çoxdan vaxtı çatıb; **2.** vaxtı / müddəti keçmiş *(veksel, borc sənədi və s. haq.);* **~ bill** müddəti keçmiş hesab; **~ book** müddəti keçmiş kitab *(kitabxanada);* **3.** *d.d.* menstruasiyası / aybaşısı gecikən *(qadın haq.)*

**overeat** ['ouvər 'i:t] *v (pt* **overate** [-'et]; *pp* **overeaten** [-'i:tn]*)* həddən artıq / çox yemək

**overestimate[1]** ['ouvər'estɪmɪt] *n* **1.** çox yüksək qiymət; **2.** şişirdilmiş smeta

**overestimate[2]** ['ouvər'estɪmeɪt] *v* **1.** çox yüksək qiymətləndirmək / qiymət vermək, çox şişirtmək; *Don't overestimate your abilities Öz imkanını / imkanınızı çox şişirtmə / şişirtməyin*; **2.** şişirdilmiş smeta tərtib etmək

**overestimation** ['ouvər'estɪmeɪʃn] *n* çox yüksək qiymətləndirmə / qiymət vermə, çox şişirtmə

**overfall** ['ouvəfɔ:l] *n* **1.** artıq su axıdılan qurğu; **2.** *dən.* qıjov *(çayın iti axan yeri)*

**overfill** [,ouvə'fɪl] *v* həddən artıq dolmaq/doldurmaq; *His stomach was overfilled Onun qarnı həddən artıq dolu idi*

**overflow[1]** ['ouvəflou] *n* **1.** dolub daşma, ağzınacan dolma; **2.** daşqın, su basqını, sel, suyun qalxması; **3.** *məc.* artıq, həddən çox bolluq / artım; **~ of population** əhalinin sayının həddindən artıq olması; **4.** *tex.* suaşıran *(artıq suyun axması üçün bəndin divarında açılan dəlik)*

**overflow[2]** ['ouvəflou] *v* **1.** dolub daşmaq; su basmaq, doldurmaq; daşmaq *(çay); The fields were overflowed with the heavy rain Güclü yağış üzündən çölləri su basmışdı;* **2.** *məc.* tökülüşmək, axışıb gəlmək; yayılmaq; dağılmaq; *The crowd overflowed into the adjoining gardens Camaat qonşu bağlara axışıb gəldi;* **3.** ağzınacan doldurmaq/dolmaq/dolu olmaq; *The square below and the streets overflow Aşağıdakı meydan və küçələr camaatla dolu olur*

**overfulfil** ['ouvəful'fɪl] *v* artıqlaması ilə doldurmaq/yerinə yetirmək; **to ~ the production plan** istehsal planını artıqlaması ilə yerinə yetirmək

**overfulfilment** ['ouvəful'fɪlmənt] *n* artıqlaması ilə doldurma / yerinə yetirmə **~ of the production plan** istehsalat planının artıqlaması ilə doldurulması / yerinə yetirilməsi

**overfull** ['ouvə'ful] *adj* ağzınacan / həddən artıq dolu

**overgrow** ['ouvə'grou] *v (pt* **overgrew** [-'gru:]; *pp* **overgrown** [-'groun]*)* **1.** artmaq; genişlənmək, yayılmaq, uzanmaq; **2.** ot / tük və s. basmaq; zibilləmək, zibillənmək; *The tares over-*

**paint²** [peɪnt] *v* **1.** rəng / boya vurmaq, rəngləmək; **to ~ a door / wall / house** qapı / divar / ev rəngləmək; *Paint the ceiling white Tavanı ağ rənglə / rəngləyin*; **2.** boya ilə şəkil çəkmək; **to ~ a portrait in oils** yağlı boya ilə portret / şəkil çəkmək; **3.** təsvir etmək, obrazını yaratmaq; **to ~ in bright colours** əlvan rənglərlə təsvir etmək; **4.** üz-gözünü boyamaq; qrimlənmək; **5.** *d.d.* oyyaşlıq etmək; **6.** *tib.* sürtmək; **to ~ with iodine** yod sürtmək;

◊ **to ~ the lily** faydasız işlə məşğul olmaq; **to ~ the town red** kef etmək / çəkmək, vaxtını oyyaşlıqda / kefdə keçirmək, içki məclisi düzəltmək, eyş-işrətlə məşğul olmaq

**paintbox** [ˈpeɪntbɔks] *n* boya / rəng dəsti

**paintbrush** [ˈpeɪntbrʌʃ] *n* fırça

**painted** [ˈpeɪntɪd] *adj* **1.** boya ilə çəkilmiş / təsvir edilmiş; **2.** üz-gözü boyanmış / qrimlənmiş; **3.** alabəzək, al-əlvan; **~ birds** al-əlvan lələkli quşlar; **4.** *d.d.* ikiüzlü, riyakar, saxta, yalançı

**painter** [ˈpeɪntəʳ] *n* **1.** rəssam; naqqaş; **a famous ~** məşhur rəssam; **2.** rəngsaz; **to work as a ~** rəngsaz işləmək

**painting** [ˈpeɪntɪŋ] *n* **1.** rəssamlıq; naqqaşlıq; **2.** şəkil; rəsm; **a ~ in oils** yağlı boya ilə çəkilmiş şəkil / rəsm; **3.** təsvir, təsvir etmə; **a vivid ~ of his impressions** öz təəssüratlarının canlı təsviri / ifadəsi; **4.** boyama, rəngləmə, rənglərlə bəzəmə; **5.** rəngsaz işi

**painty** [ˈpeɪntɪ] *adj* **1.** yeni boyanmış / rənglənmiş; **2.** pis boyanmış, kobud çəkilmiş *(şəkil)*; həddən artıq boya vurulmuş / çəkilmiş; **~ picture** həddən artıq boya işlədilərək çəkilmiş şəkil

**pair¹** [peəʳ] *n* **1.** cüt; cüt əşyalar; **a ~ of gloves / shoes / socks** bir cüt əlcək / ayaqqabı / corab; **2.** iki; **a ~ of eyes / hands / feet** *d.d.* iki göz / əl / ayaq; **in ~s** qoşa, cüt-cüt; **to work in ~s** qoşa işləmək; **to go in ~** cüt-cüt getmək; *These earrings are only sold in pairs Bu sırğalar ancaq cüt-cüt satılır*; **3.** iki hissədən ibarət olan əşyalar; **a ~ of scissors/trousers /binoculars / tongs/ scales** bir qayçı /şalvar / durbin / maşa/ tərəzi; *I've broken my glasses - I'll have to buy a new pair Mən eynəyimi sındırmışam, təzə eynək almalı olacam*; **4.** iki adam; ər-arvad; **the happy ~** xoşbəxt ər-arvad; **5.** biri erkək, o biri dişi olmaqla iki heyvan; **a ~ of swans** iki qu (quşu); **6.** iki at *(bir yerə qoşulmuş)*; **a coach and ~** iki atlı fayton;

◊ **a ~ of hands / feet** zəhmətkeş adam; **another ~ of shoes** başqa məsələ; **to take / to show a clean ~ of heels** qaçmaq, götürülmək, daban almaq, əkilmək

**pair²** [peəʳ] *v* **1.** qoşa-qoşa / cüt-cüt yerləşdirmək / qoymaq; cüt-cüt / qoşa-qoşa yerləşmək / yerbəyer olmaq; **2.** iki-iki birləşmək; **3.** kəbinlə birləşdirmək/birləşmək; **4.** cütləşdirmək; cütləşmək *(heyvan haq.)*; **to ~ off 1)** cüt-cüt bölmək / bölünmək; **2) (with)** *d.d.* evlənmək, evləndirmək; *She's always trying to pair her friends off with each other O həmişə dostlarını bir-biri ilə evləndirməyə çalışır*

**pajamas** [pəˈdʒa:məz] *n pl* = **pyjamas**

**pal¹** [pæl] *n d.d.* yoldaş, dost; *We are great pals Biz çox yaxın dostuq*; **to make a ~ of smb.** bir kəslə dostlaşmaq/ dost olmaq; *Now look here, pal, you're asking for trouble Bura bax dost / dostum, deyəsən sənin / sizin başın / başınız gicəlir*

**pal²** [pæl] *v* **(-ll-) (with)** *d.d.* dostluq etmək, dost olmaq, dostlaşmaq, dostlaşdırmaq

**palace** [ˈpælɪs] *n* **1.** saray, imarət; iqamətgah; **Buckingham Palace** Bokinham sarayı; **a presidential ~** prezident sarayı / iqamətgahı; *Compared to ours their house is a palace Bizimki ilə müqayisədə onların evi saraydır*; **2.** dəbdəbəli / cəlbedici / möhtəşəm bina *(restoran, kafe və s.)*

**palaeolithic** [ˌpæliouˈlɪθɪk] *adj geol.* paleolit; **the ~ age** paleolit dövrü

**palaeontologist** [ˌpælɪɔnˈtɔlədʒɪst] *n* paleontoloq *(paleontologiya mütəxəssisi)*

**palaeontology** [ˌpælɪɔnˈtɔlədʒɪ] *n* paleontologiya *(qazıntı halında tapılan daşa dönmüş heyvan və bitkilərdən bəhs edən elm)*

**palatable** [ˈpælətəbl] *adj* **1.** dadlı, ləzzətli; **fresh and ~ food** təzə və dadlı yemək; **2.** xoşagələn; *The truth is not always palatable Həqiqət həmişə xoşagələn olmur / xoşa gəlmir*

**palatal¹** [ˈpælətl] *n fon.* damaq səsi, incə səs

**palatal²** [ˈpælətl] *adj fon.* damaq; **~ sounds** damaq səsləri

**palate** [ˈpælɪt] *n* **1.** *anat.* damaq; **the hard / the soft ~** sərt / yumşaq damaq; **2.** dad, dad bilmə qabiliyyəti; **3.** zövq; **to have a delicate ~** incə zövqə malik olmaq; **4.** meyl, maraq

**palatial** [pəˈleɪʃl] *adj* **1.** saray, saray kimi; **2.** əzəmətli, dəbdəbəli, cah-calallı, möhtəşəm; **a ~ dining room** möhtəşəm/dəbdəbəli yemək otağı; **a ~ hotel** əzəmətli/dəbdəbəli/cah-calallı mehmanxana

**palatially** [pəˈleɪʃəlɪ] *adv* təmtəraqla, dəbdəbə ilə, çox gözəl / qəşəng

**palaver¹** [pəˈla:vəʳ] *n d.d.* **1.** müşavirə, danışıq; **2.** boş laqqırtı, boşboğazlıq, naqqallıq, çərən-pərən; *None of your palaver! Boş-boş danışmağı kəs / kəsin! Cut the palaver, let's get to the point Naqqallığı qurtar / qurtarın, gəl / gəlin əsas məsələyə keçək*; **3.** yaltaqlıq, yaltaqcasına / yalan tərif; **4.** iş, qayğı; *It's none of your palaver! Sənin / Sizin işin / işiniz deyil*

**palaver²** [pəˈla:vəʳ] *v d.d.* **1.** naqqallıq/ boşboğazlıq etmək; çənə/laqqırtı vurmaq; **2.** *(həm də* **to ~ over)** yaltaqlanmaq, yalandan tərifləmək; **to ~ *smb.* into *smth.*** yaltaqlanmaqla bir kəsi bir şey etməyə razı salmaq

**pale¹** [peɪl] *n* **1.** paya, dirək; **2.** sərhəd, hüdud; **out of the ~** hüduddan/sərhəddən kənar; **within the ~** hüdudunda



**pale²** [peɪl] *adj* **(-r, -st) 1.** solğun, rəngi qaçmış / ağarmış, saralmış; **~ face** solğun / rəngi qaçmış sifət; **to grow / to become ~** rəngi qaçmaq, solmaq, saralmaq; **to turn ~ with fright** qorxudan rəngi qaçmaq / saralmaq; **2.** zəif, sönük, tutqun; **by the ~ light of the moon / candle** ayın / şamın zəif işığında

**pale³** [peɪl] *v* **I** paya ilə hasar çəkmək

**pale** [peɪl] *v* **II 1.** solmaq, rəngi qaçmaq, saralmaq, ağarmaq *(sifət və s. haq.)*; **2.** zəifləmək, zəifləşmək, tutqunlaşmaq; *Stars are paling Ulduzlar tutqunlaşır*; **to ~ beside** zəif görünmək *(bir şeylə müqayisədə)*; *My story pales beside yours Mənim hekayəm səninkinin / sizinkinin yanında zəif görünür*; **3.** soldurmaq, saraltmaq, rəngini qaçırtmaq; *Illness had paled her Xəstəlik onu soldurmuşdu / saraltmışdı*

**pale-faced** [ˈpeɪlfeɪst] *adj* solğun bənizli; rəngi qaçmış / ağarmış; **a ~ girl** solğun bənizli qız

**paleness** [ˈpeɪlnɪs] *n* solğunluq

**paling** [ˈpeɪlɪŋ] *n* hasar, çəpər *(payadan çəkilmiş)*

**palisade** [ˌpælɪˈseɪd] *n* hasar, çəpər, ağac hasar / çəpər, dəmir barmaqlıqlardan çəkilmiş hasar

**palish** [ˈpeɪlɪʃ] *adj* solğun / solmuş kimi, bir az solğun / solmuş

**pall¹** [pɔ:l] *n* **1.** örtük *(tabutun üstünə salınan)*; **2.** pərdə; **a ~ of smoke** tüstü pərdəsi; *A pall of smoke hung over the town Şəhərin üstündə tüstü pərdəsi asılmışdı*

**pall²** [pɔ:l] *v* **I 1.** örtmək, bürümək; **2.** tutqunlaşdırmaq; qaranlıqlaşdırmaq

**pall** [pɔ:l] *v* **II** təngə gətirmək, bezdirmək, usandırmaq, bıqdırmaq, çiyrəndirmək; *Pleasures pall Kef təngə gətirir / usandırır; The pastimes palled on him Əyləncələr onu təngə gətirdi; Lying on a beach doing nothing begins to pall after a while Çimərlikdə boş-bekar uzanmaq bir müddətdən sonra adamı bezdirir/usandırır/təngə gətirir*

**pallbearer** [ˈpɔ:lbeərəʳ] *n dəfn mərasimində tabutun yanı ilə gedib onun aparılmasına kömək edən adam*

**pallet** [ˈpælɪt] *n* **1.** saman döşək, samandan düzəldilmiş yatacaq; **2.** dar bərk çarpayı

**palliasse** [pælˈjæs] *n* saman döşək; döşəkaltı *(samandan düzəldilmiş)*

**pally** [ˈpælɪ] *adj d.d.* adamayovuşan, ünsiyyətli, mehriban, adamlarla tez diltapan

**palm¹** [pa:m] *n* **I 1.** *bot.* palma; **2.** palma budağı *(qələbə rəmzi)*; **3.** *məc.* qələbə; **to bear/to carry off the ~** qələbə çalmaq /qazanmaq; qalib gəlmək, birinciliyi / üstünlüyü ələ almaq; **to yield the ~** qələbəni / birinciliyi əldən vermək, məğlub olmaq

**palm** [pa:m] *n* **II 1.** ovuc, əlin içi; **to read *smb.*'s ~** bir kəsin falına baxmaq *(əlinə baxmaqla)*; *He held the bird in the palm O, quşu ovucunda saxlayırdı*; **2.** bir ovuc, azca *(ölçü)*;

◊ **to grease / to oil *smb.*'s ~** bir kəsə rüşvət vermək; **to have an itching ~** rüşvətxor / pul hərisi olmaq; **to hold *smb.* in the ~ of *one's* hand** bir kəsi əlində / əlinin içində saxlamaq

**palm²** [pa:m] *adj* palma; **~ tree** palma ağacı; **~ oil** palma yağı; **Palm Sunday** Pasxanın birinci günü

**palm³** [pa:m] *v* **1.** ovcunda gizlətmək *(kartı və s.)*; **2.** ovcu ilə sığallamaq; **3.** ələ almaq/gətirmək, aldatmaq *(rüşvət, bəxşiş və s. vermaklə)*; **to ~ off** sırımaq, soxuşdurmaq; satmaq; *He palmed off a bad coin on somebody. O, saxta sikkəni kiməsə sırıdı / soxuşdurdu*

**palmist** [ˈpa:mɪst] *n* falçı, əl falçısı

**palmistry** [ˈpa:mɪstrɪ] *n* **1.** əl falı, ələ baxıb fal açma; **2.** əlin məharəti / bacarığı / çəldliyi *(oğurluqda, fırıldaqda və s.)*

**palpability** [ˌpælpəˈbɪlɪtɪ] *n* hiss oluna bilmə, hiss olunma; gözə çarpma; toxunmaqla hiss etmə qabiliyyəti

**palpable** [ˈpælpəbl] *adj* **1.** hiss olunan, duyulan; gözəçarpan, nəzəri cəlb edən; **2.** açıq, aşkar; **~ difference** aşkar / aydın fərq

**palpate** [ˈpælpeɪt] *v* **1.** əllə yoxlamaq, əlləyib yoxlamaq; **2.** *tib.* əlləmək, əl ilə yoxlamaq *(xəstəni)*

**palpation** [pælˈpeɪʃn] *n* **1.** əllə yoxlama, əlləmə; **2.** *tib.* əl ilə yoxlama *(xəstəni)*

**palpitate** [ˈpælpɪteɪt] *v* **1.** bərk çırpınmaq / vurmaq *(nəbz, qan damarı)*, döyünmək *(ürək)*; **2.** titrəmək, əsmək *(qorxudan, sevincdən, həyəcandan)*; **to ~ with joy / fear / terror** sevincdən / qorxudan / dəhşətdən əsmək / titrəmək

**palpitation** [ˌpælpɪˈteɪʃn] *n* **1.** bərk ürək döyünməsi / döyüntüsü; sürətlə döyünmə / vurma *(ürək, nəbz, qan damarı haq.)*; **2.** əsmə, titrəmə; **a ~ of the leaves** yarpaqların əsməsi / titrəməsi

**palsied** [ˈpɔ:lzɪd] *adj* iflic olmuş / vurmuş / edilmiş

**palsy¹** [ˈpɔ:lzɪ] *n* **1.** iflic, iflic əsməsi / titrəməsi; **2.** fəaliyyətsiz vəziyyətə salma

**palsy²** [ˈpɔ:lzɪ] *v* **1.** *tib.* iflic etmək / olmaq; **2.** fəaliyyətsiz etmək, gücdən salmaq, zəiflətmək

**palter** [ˈpɔ:ltəʳ] *v* **1.** kələk / hiylə / fırıldaq gəlmək, biclik /kələkbazlıq / hiyləgərlik etmək; **2.** boş işlərlə məşğul olmaq

**paltry** [ˈpɔ:ltrɪ] *adj* **1.** kiçik, cüzi, çox kiçik / az; **a ~ sum** kiçik / cüzi məbləğ; *He sold his painting for a paltry sum of money O, şəklini kiçik bir məbləğ pula satdı*; **2.** əhəmiyyətsiz, dəyərsiz, heç bir dəyəri olmayan, mənasız; **3.** mənfur, nifrətəlayiq; **~ fellow** nifrətəlayiq tip / adam

**pamper** [ˈpæmpəʳ] *v* əzizləmək, nazlamaq, ərköyün böyütmək, korlamaq; **to ~ *one's* children** uşaqlarını əzizləmək / ərköyün böyütmək

**pampered** [ˈpæmpəd] *adj* ərköyün böyümüş/ böyüdülmüş; **a ~ child of rich parents** dövlətli valideynlərin ərköyün böyümüş / böyüdülmüş uşağı

**pamphlet** [ˈpæmflɪt] *n* **1.** kitabça; **2.** pamflet, həcv

**pamphleteer** ['pæmflı'tıəʳ] *n* 1. pamfletçi, pamflet / həcv yazan

**pan¹** [pæn] *n* 1. qazan; 2. kasa; tas, ləyən; teşt; 3. tərəzi gözü; 4. *amer. d.d.* sifət, çöhrə; **dead ~** ifadəsiz sifət / çöhrə;
◊ **~ digger** qızılaxtaran; **to shut *one's* ~** sirr saxlamaq, dilini fərağat saxlamaq; **to leap / to fall out of the ~ into the fire** *at. söz.* ≅ yağışdan çıxıb yağmura düşmək

**pan²** [pæn] *v* (**-nn-**) 1. qazanda bişirmək; 2. tərkibində qızıl olan torpağı yumaq; 3. *amer.* kəskin tənqid etmək; *The film was panned by the critics Film tənqidçilər tərəfindən kəskin tənqid edildi*

**panacea** [,pænə'sıə] *n* panaseya *(bütün dərdlərin dərmanı); Honey was panacea for all his diseases Bal onun bütün xəstəliklərini sağaltdı*

**panama** [,pænə'mɑ:] *n (həm də ~* **hat**) zərif materialdan/samandan hazırlanmış papaq

**panatella** [,pænə'telə] *n* uzun nazik siqar

**pancake¹** ['pænkeık] *n* 1. blin, fəsəli, nazik kökə; 2. *av. d.d.* paraşütlə yerə enmə; **flat as a ~** fəsəli kimi yastı, yapyastı

**pancake²** ['pænkeık] *v* paraşütləmək *(ən az sürətlə uçmaq)*

**pancreas** ['pæŋkrıəs] *n anat.* mədəaltı vəzi

**pancreatic** [,pæŋkrı'ætık] *adj anat.* mədəaltı vəziyə aid olan; **~ juice** mədəaltı vəzinin şirəsi; **~ cancer** mədəaltı vəzinin xərçəngi

**panda** ['pændə] *n zool.* panda *(Himalay dağlarında yaşayan, ayıyaoxşar yırtıcı heyvan)*

**pandemic¹** [pæn'demık] *n tib.* pandemiya *(geniş yayılmış epidemiya)*

**pandemic²** [pæn'demık] *adj* 1. ümumi, pandemik *(adət. xəstəlik haq.)*; 2. cismani, şəhvani

**pandemonium** [,pændı'mounıəm] *n* 1. çaxnaşma, vəlvələ, həyəcan; *Pandemonium broke out when the news was announced Xəbər elan edildikdə çaxnaşma başladı / həyəcan başlandı*; 2. səs, səs-küy, qalmaqal; *Pandemonium reigned in the classroom until the teacher arrived Müəllim gələnə kimi sinifdə dəhşətli hay-küy / səs-küy vardı*

**pander¹** ['pændəʳ] *n* 1. vasitəçi, aradüzəldən; 2. köməkçi, əlbir *(cinayətdə)*

**pander²** ['pændəʳ] *v* 1. vasitəçilik etmək, ara düzəltmək; 2. əlbir olmaq; 3. göz yummaq, yol / imkan vermək *(pis işə)*, görməməzliyə vurmaq

**pane** [peın] *n* ayna, pəncərə şüşəsi *(həm də ~* **of glass**); *Some of the panes in my windows were broken Mənim pəncərələrimin bir neçə şüşəsi sınmışdı*

**panegyric¹** [,pænı'dʒırık] *n* mədhiyyə, mədhnamə, tərifləmə

**panegyric²** [,pænı'dʒırık] *adj* = **panegyrical**

**panegyrical** [,pænı'dʒırıkl] *adj* mədhiyyə, mədhiyyə edən, mədhedici, tərifləyici; tərif edən

**panegyrist** [pə'ni:dʒırıst] *n* mədhiyyəçi, mədhiyyə yazan; məddah

**panegyrize** ['pænıdʒıraız] *v* mədh etmək, tərifləmək; mədhiyyə yazmaq

**panel¹** ['pænl] *n* 1. panel *(otaq divarının aşağı hissəsi)*; 2. səki; 3. *panel radioqəbuledicinin və s. cihazların bütün hissələri quraşdırılan taxta*; 4. *dona başqa parçadan əlavə edilmiş calaq*; 5. siyahı; **to be on the ~** siyahıda olmaq; 6. vacib ictimai məna kəsb edən məsələni açıq müzakirə edəcək mütəxəssislərin siyahısı; 7. yəhər döşəkçəsi; 8. ayna və ya qapı çərçivəsinin ayrı-ayrı şüşələri; 9. uzun nazik formatlı fotoşəkil

**panel²** ['pænl] *v* 1. paneldən üz vurmaq / çəkmək; 2. haşiyə tikmək / vurmaq, köbələmək, köbə tikmək *(başqa materialdan və ya başqa rəngli eyni materialdan)*; 3. *hüq.* məhkəmə iclasçılarının siyahısını tutmaq/tərtib etmək

**panelled** ['pænld] *adj* panellə bəzədilmiş, panel vurulmuş; **a ~ room / ceiling / wall** panel vurulmuş otaq / tavan / divar

**pang** [pæŋ] *n* 1. qəfil kəskin sancılı ağrı; 2. *pl* əzab, əziyyət; **the ~s of hunger** aclıq əzabı / əziyyəti; **the ~s of death** ölüm əzabı, can vermə; **the ~s of jealousy** qısqanclıq əzabı; **to feel a ~ of conscience** vicdan əzabı çəkmək

**panhandle¹** ['pæn,hændl] *n* 1. qazanın qulpu; 2. *amer.* iki ərazi arasında olan uzun nazik çıxıntı; 3. *amer. d.d.* dilənçilik, yolçuluq; yalvarıb istəmə / alma, xahiş edib alma; **to work a ~ on *smb.*** bir kəsdən yalvar-yaxarla pul almaq

**panhandle²** ['pæn,hændl] *v amer. d.d.* dilənçilik etmək, dilənmək, əl açmaq

**panhandler** ['pæn,hændləʳ] *n amer. d.d.* dilənçi, yolçu

**panic¹** ['pænık] *n* çaxnaşma, təlaş, vahimə, vəlvələ; **~ of the Stock Exchange** birjada çaxnaşma / təlaş / vəlvələ; **to creat a ~** çaxnaşma yaratmaq, vəlvələ salmaq; **to be in a (state of) blind ~ about *smth.*** bir şey haqqında bərk təlaş keçirmək; **to get into a ~** təlaş keçirmək; *I got into a panic when I found the door was locked Qapının bağlı olduğunu gördükdə, mən bərk təlaş keçirdim; There was (an) immediate panic when the alarm sounded Həyəcan siqnalı verildikdə, dərhal çaxnaşma / vəlvələ düşdü*

**panic²** ['pænık] *adj* 1. dəhşətli, şiddətli, bərk; **in ~ fear / terror** bərk qorxu / dəhşət içərisində; 2. tez vahiməyə / qorxuya / vəlvələyə düşən

**panic³** ['pænık] *v* 1. qorxutmaq, qorxuya salmaq; 2. təşvişə düşmək, başını itirmək; *Don't panic! Təşvişə düşmə / düşməyin!*; 3. gülüş doğurmaq; *Your complaints panic me Sənin / Sizin şikayətlərin / şikayətləriniz məndə gülüş doğurur*

**panicky** ['pænıkı] *adj d.d.* təlaşlı, təlaş / vahimə ifadə edən; **a ~ voice** təlaşlı səs; *Don't get panicky Təşvişə düşmə/ düşməyin*

**panic-stricken** ['pænık,strıkən] *adj* təlaşlı, təşvişli; qorxu bürümüş, vahiməyə düşmüş; *She sounded panic-stricken on the phone Telefonda o çox təlaşlı danışdı*

**pannier** ['pænıəʳ] *n* 1. səbət *(xüs. yük heyvanlarının daşıyacağı)*; qutu; 2. çənbər, qurşaq; 3. krinolin *(içərisinə nazik çənbər salınaraq geyilən enli qadın tumanı)*

**panoply** ['pænəplı] *n* 1. yaraq-əsləhə *(qalxan, geyim və s.)*; 2. *məc.* müdafiə, mühafizə; 3. örtü, örtük, pərdə; libas; **the beautiful ~ of autumn** payızın gözəl libası; 4. təmtəraq, ehtişam, dəbdəbə, büsat; gözəllik, qəşənglik; **pomp and ~** dəbdəbə və parlaqlıq; 5. qənimət götürülmüş dekorativ silah

**panorama** [,pænə'rɑ:mə] *n* 1. panorama, mənzərə, görünüş; *From the summit there is a superb panorama of the Alps Yüksəklikdən Alp dağlarının çox gözəl panoraması açılır*; 2. sözlər və ya rəsm vasitəsilə ətraflı təqdimat; *This book gives a panorama of life in England 400 years ago Bu kitabda İngiltərənin 400 il bundan əvvəlki həyatı ətraflı (tərzdə) təsvir edilmişdir*

**panoramic** [,pænə'ræmık] *adj* panoram; mənzərəli; **a ~ view from the top of tower** qüllədən mənzərəli görünüş

**pan-pipe** ['pænpaıp] *n* sümsü, tütək, ney

**pansy** ['pænzı] *n* 1. alabəzək bənövşə; 2. pederast; uşaqbaz

**pant¹** [pænt] *n* 1. təngnəfəslik, tövşümə; 2. nəfəs, nəfəs alma

**pant²** [pænt] *v* 1. tez-tez nəfəs almaq; boğulmaq, təngnəfəs olmaq, tövşümək; *He was panting heavily as he ran O, qaçdığına görə tövşüyürdü*; 2. ləhləmək; fısıldamaq *(həm də maşın haq.)*; boğula-boğula danışmaq; 3. qızğın / coşğunluqla istəmək; həsrətində olmaq; *The girl was panting to dance, but no one asked her Qız oynamaqdan ötrü əldən gedirdi, lakin onu heç kəs dəvət etmədi*

**pantheism** ['pænθi:ızm] *n fəls.* panteizm *(Allahı təbiətlə eyniləşdirən dini fəlsəfi dünyagörüşü)*

**pantheist** ['pænθi:ıst] *n fəls.* panteist *(panteizm tərəfdarı)*

**panther** ['pænθəʳ] *n zool.* panter, bəbir *(pişiklər cinsindən heyvan)*

**panties** ['pæntız] *n (Özündən sonra fel cəmdə işlənir) d.d.* 1. uşaq şalvarı; 2. trusı *(qısa tuman)*

**panting** ['pæntıŋ] *adj* 1. boğulan; tövşüyən, təngnəfəs olan; 2. ehtirasla arzu edən, həsrət çəkən, həsrətində olan; 3. güclü, bərk, şiddətli; **~ tension** şiddətli / çox bərk gərginlik

**panto** ['pæntou] *n (pl* **-os** [-ouz]) *d.d.* **pantomime** *sözünün qısa forması*

**pantomime¹** ['pæntəmaım] *n* 1. pantomima *(mimika və hərəkətlərlə ifa olunan teatr tamaşası)*; 2. feeriya *(əfsanə məzmunlu teatr tamaşası: xüs. uşaqlar üçün)*; 3. əl-qol hərəkəti ilə danışma / fikir ifadə etmə; **to express oneself in ~** öz fikrini əl-qol hərəkətilə ifadə etmək / bildirmək

**pantomime²** ['pæntəmaım] *v* əl-qol hərəkəti ilə danışmaq, fikrini jestlər vasitəsilə ifadə etmək; *He pantomimed drinking wine O, şərab içməyi jestlər vasitəsilə göstərdi*



**pantry** ['pæntrı] *n* 1. anbar *(ərzaq saxlamaq üçün)*; 2. balaca otaq *(gəmidə, oteldə və s.)*

**pantry-boy** ['pæntrıbɔı] *n* bufetçi köməkçisi işləyən oğlan *(sərnişin gəmisində)*

**pantry-man** ['pæntrımæn] *n* 1. *(pl* **-men** [-mən]) bufetçi *(gəmidə)*; 2. bufetçi, bufetçi köməkçisi

**pants** [pænts] *n (Özündən sonra fel cəmdə işlənir)* 1. *amer.* şalvar, tuman; *I've known him since he was in short pants Mən onu qısa tuman geydiyi zamandan (yəni uşaq vaxtından) tanıyıram*; **deck ~** *d.d.* dizə qədər olan qadın şalvarı; 2. kişi tumanı; trusı

**pap** [pæp] *n* 1. sıyıq; xəşil, horra; 2. əyləncə ədəbiyyatı; 3. *arx.* qadın döşünün / məməsinin giləsi

**papa** [pə'pɑ:] *n* ata, keşiş, keşiş baba *(pravoslavlarda)*

**paper¹** ['peıpəʳ] *n* 1. kağız; **a piece / a sheet of ~** bir parça / bir vərəq kağız; **brown ~** sarğı / sarğılıq kağızı; **ruled ~** milli / mil-mil / cızıqlı kağız; **to put pen to ~** yazmağa başlamaq, yazmaq; **on ~** 1) yazılmış; yazılı formada; *I'd rather see it on paper Mən istərdim ki, bu, yazılı formada olsun*; 2) nəzəri olaraq; 3) saxta, qondarma, uydurma; **~ army** yalan / qondarma ordu; 2. kağız vərəqi; **blank ~** təmiz / yazılmamış vərəq; 3. şəxsi və ya xidməti sənəd; **officer's ~s** zabit sənədləri; 4. kağız pul, veksel *(borc sənədi)*; *Paper is as good as ready money Veksel elə nağd pul kimi yaxşıdır*; 5. qəzet, jurnal; **local ~** yerli qəzet; **evening ~** axşam qəzeti; **Sunday ~** bazar günü çıxan qəzet; **fashion ~** moda jurnalı; 6. imtahan bileti; 7. yazılı iş; *I was correcting examination papers Mən imtahan yazı işlərini yoxlayırdım*; **to set a ~** yazı işi üçün mövzu vermək; 8. elmi hesabat, məqalə; **to read *one's* ~** məruzə etmək / oxumaq; 9. oboy, divar kağızı

**paper²** ['peıpəʳ] *adj* kağız, kağızdan qayrılmış / hazırlanmış / düzəldilmiş; **~ bag** kağız torba; **~ handkerchief / towel** kağız dəsmal

**paper³** ['peıpəʳ] *v* 1. kağıza bükmək; 2. oboy/divar kağızı vurmaq; *I've had my room papered again Mən otağıma yenidən oboy vurdurmuşam*; 3. kağızla təmin etmək

**paper-boy** ['peıpəbɔı] *n* evlərə qəzet paylayan oğlan

**paper currency** ['peıpə'kʌrənsı] *n* 1. kağız pul, əskinas; 2. kağız pulun dövriyyəsi

**paper-cutter** ['peıpə,kʌtəʳ] *n poliqr.* kağızkəsən maşın

**paper-fastener** ['peıpə,fa:snəʳ] *n* kağız sancağı

**paper-folder** ['peıpə,fouldəʳ] *n* 1. kağız üçün qovluq; 2. *poliqr.* bükmə maşını, bükücü maşın

**paper-hanger** ['peıpə,hæŋəʳ] *n* divar kağızı çəkən; bəzəkçi

**paper-knife** ['peıpənaıf] *n (pl* **-knives** [-naıvz]) kağız bıçağı, kağız kəsmək üçün bıçaq

**paper-mill** [ˈpeɪpəmɪl] *n* kağız fabriki
**paper-work** [ˈpeɪpəwɜ:k] *n* 1. yazı işi; 2. dəftərxana işi
**papyrus** [pəˈpaɪrəs] *n bot.* papirus *(çoxillik tropik bitki)*
**par** [pa:ʳ] *n* 1. bərabərlik; **on / upon a ~ with** bərabər / eyni bir vəziyyətdə; *He was quite on a par with men like these two O, bu iki adamla tamamilə eyni vəziyyətdə idi*; 2. nominal dəyər / qiymət *(yəni qiymətli kağızların üstündə göstərilən dəyər)*; **at / up to ~** nominal qiymətə / dəyərə; **above / below ~** nominal dəyərdən yuxarı / aşağı; 3. normal vəziyyət; **on a ~** normal vəziyyətdə; **to feel above / below ~** özünü normal / pis hiss etmək; *I am about up to par Mən özümü pis hiss etmirəm*
**parable**[1] [ˈpærəbl] *n* əxlaqi / ibrətli hekayə; kinayə, eyham, məcaz
**parable**[2] [ˈpærəbl] *v* kinayə ilə / eyhamla / məcazla danışmaq
**parabolic** [ˌpærəˈbɒlɪk] *adj* 1. ibrətli, eyhamlı; məcazi; 2. *riyaz.* parabolik, parabola şəklində olan; **~ curve** parabolik əyri
**parachute**[1] [ˈpærəʃu:t] *n* paraşüt; **to land by ~** paraşütlə yerə enmək; **to rig a ~** paraşütü yığmaq / qablaşdırmaq
**parachute**[2] [ˈpærəʃu:t] *adj* paraşüt; **~ jump / leap** paraşütlə tullanma; **~ landing** paraşütlə yerə enmə; **~ canopy** paraşütün qübbəsi
**parachute**[3] [ˈpærəʃu:t] *v* 1. paraşütlə atmaq /tullamaq / endirmək; *We parachuted into enemy territory Biz paraşütlə düşmən ərazisinə endik; Supplies were parachuted into the earthquake zone Zəlzələ zonasına ərzaq paraşüt vasitəsilə endirildi*; 2. paraşütlə tullanmaq / atılmaq; *She enjoys parachuting O, paraşütlə tullanmaqdan həzz alır*
**parachute-jumper** [ˈpærəʃu:tdʒʌmpəʳ] *n* paraşütçü, paraşütdən tullanan
**parachutist** [ˈpærəʃu:tɪst] *n* = **parachute-jumper**
**parade**[1] [pəˈreɪd] *n* 1. göstərmə, nümayiş etdirmə; müsabiqə; **mannequin ~** moda nümayişi; **beauty ~** gözəllik müsabiqəsi; **to make a ~ of** *one's* **knowledge** biliyini nümayiş etdirmək / göstərmək; 2. parad; təntənə, bayram; **to be on ~** paradda / təntənədə iştirak etmək; **the May Day / a Victory Parade** May bayramı / Qələbə paradı; **a military ~** hərbi parad
**parade**[2] [pəˈreɪd] *v* 1. nümayiş etdirmək, göstərmək; **to ~ *one's* skill / *one's* learning** öz bacarığını / biliyini nümayiş etdirmək; *She never paraded her learning O, heç vaxt biliyini nümayiş etdirmirdi*; 2. təkəbbürlə / təntənə ilə yerimək; **to ~ the streets** küçələrdə təntənə ilə yerimək; 3. *hərb.* nizamla addımlamaq / yerimək, cərgə ilə yerimək, cərgəyə düzmək / düzülmək; **to ~ under arms** tam silahlı şəkildə nizamla addımlamaq / cərgə ilə yerimək

**paradigm** [ˈpærədaɪm] *n* 1. nümunə, misal; **a ~ for others to copy** başqalarının qəbul edəcəyi nümunə; 2. *qram.* paradiqm *(hər hansı bir sözün hallanması və ya dəyişməsi formalarını göstərən cədvəl)*; **verb ~s** felin paradiqmləri
**paradigmatic** [ˌpærədɪgˈmætɪk] *adj* nümunəvi, örnək
**paradigmatically** [ˌpærədɪgˈmætɪkəlɪ] *adv* nümunəvi, nümunəvi / örnək olaraq
**paradise** [ˈpærədaɪs] *n* cənnət *(həm də məc.)*; **an earthly ~** dünyəvi cənnət; *This island is a paradise for bird-watchers Bu ada quşları öyrənənlər üçün cənnətdir*
**paradox** [ˈpærədɒks] *adj* paradoks *(sağlam düşüncəyə düz gəlməyən / zidd olan fikir)*
**paradoxical** [ˌpærəˈdɒksɪkəl] *adj* paradoksal; anlaşılmaz, qeyri-adi, sağlam düşüncəyə sığmayan, ağlasığmayan
**paraffin** [ˈpærəfɪn] *n* 1. parafin; **liquid ~** maye parafin; 2. neft, ağ neft
**paragon**[1] [ˈpærəgən, -gɒn] *n* nümunə, əxlaq / ismət örnəyi, ləyaqət, məziyyət; **a ~ of beauty** gözəllik nümunəsi; **a ~ of a wife** arvadlığın nümunəsi / ləyaqəti
**paragon**[2] [ˈpærəgən, -gɒn] *adj* nümunəvi, eyibsiz, nöqsansız, qüsursuz, mükəmməl, əla, gözəl; *Those jewels were paragon O brilyantlar qüsursuzdur / eyibsizdir*
**paragraph**[1] [ˈpærəgra:f] *n* 1. abzas, sətirbaşı; **to begin a new / a fresh ~** yeni abzasdan başlamaq; 2. kiçik məqalə *(qəzetdə)*; qısa məlumat; *There's a paragraph on the accident in the local paper Hadisə haqqında yerli qəzetdə kiçik məqalə var*
**paragraph**[2] [ˈpærəgra:f] *v* 1. qısa məqalələr yazmaq; 2. qısa məqalə nəşr etdirmək / etmək; 3. abzaslara bölmək; *The article was badly paragraphed Məqalə abzaslara pis bölünmüşdü*; 4. nöqtə / son qoymaq *(bir şeyə)*
**parakeet** [ˈpærəki:t] *n* 1. uzunquyruqlu tutuquşu; 2. boşboğaz, çoxdanışan, çərənçi *(adam)*
**parallel**[1] [ˈpærəlel] *n* 1. paralel xətlər; **in ~** paralel olaraq; 2. *coğ.* ekvator xəttinə müvazi olan xəyali dairə; 3. uyğunluq, mütabiqlik, müvafiqlik; bərabərlik, paralel, analoq, bənzəyiş, oxşayış; **to draw a ~ between two things** iki şeyi müqayisə etmək; *This is without parallel Bunun bərabəri / oxşarı yoxdur*; **to have no ~ in history** tarixdə tayı /tayı-bərabəri olmayan
**parallel**[2] [ˈpærəlel] *adj* 1. paralel, müvazi, yanaşı; **~ line** paralel/muvazi xətt; **~ bars** *id.* paralel tirlər; **to be ~ to / with *smth.*** bir şeyə paralel / müvazi olmaq; *Negotiations ran parallel with hostilities Danışıqlar hərbi əməliyyatlarla paralel / müvazi gedirdi*; 2. analoji, analogiyaya əsaslanan, oxşar, bənzər; **~ instances** oxşar hadisələr
**parallel**[3] [ˈpærəlel] *v* 1. palalel aparmaq, müqayisə etmək; 2. uyğun / müvafiq / oxşar olmaq; *It cannot be paralleled Buna tay / bərabər tapmaq mümkün deyil*; 3. *amer.* paralel olmaq / getmək; *The street parallels the railroad Küçə dəmir yoluna paraleldir / paralel gedir*



**parallelepiped** [ˌpærəleˈlepɪped] *n riyaz.* paralelepiped
**parallelogram** [ˌpærəˈleləgræm] *n riyaz.* paraleloqram *(qarşı-qarşıya duran tərəfləri bir-birinə bərabər və paralel olan dördbucaqlı cisim)*
**paralyse** [ˈpærəlaɪz] *v* 1. *tib.* iflic etmək / olmaq; *She is paralysed in both legs Onun hər iki ayağı iflic olub*; 2. zəifləmək, zəif salmaq; iflic halına salmaq; **to ~ *smb.'s* efforts** bir kəsin səylərini zəifləmək / iflic vəziyyətinə salmaq
**paralyses** [ˈpærəlɪsi:z] *n* **paralysis** *sözünün cəm forması*
**paralysis** [pəˈræləsɪs] *n (pl -ses)* 1. iflic; **stricken with ~** iflic vurmuş / olmuş; 2. *məc.* acizlik, bacarıqsızlıq, gücsüzlük; çıxılmaz vəziyyət; *The enemy army was then in a state of paralysis Düşmən ordusu o zaman çıxılmaz vəziyyətdə idi*
**paralytic** [ˌpærəˈlɪtɪk] *adj* 1. iflic olmuş / vurmuş; iflic; 2. *məc.* zəifləmiş, gücsüz, taqətsiz, qüvvəsiz
**paralyze** [ˈpærəlaɪz] *v* = **paralyse**
**parameter** [pəˈræmɪtəʳ] *n (adət. pl)* parametr *(hər-hansı bir hadisənin bu və ya digər xassəsini göstərən kəmiyyət)*
**paramilitary** [ˌpærəˈmɪlɪtərɪ] *adj* yarımhərbi; **~ formation** yarımhərbi hissə; hərbiləşdirilmiş təşkilat; **~ police** yarımhərbiləşdirilmiş polis
**paramount** [ˈpærəmaunt] *adj* 1. əsas, birinci dərəcəli; **of ~ importance** böyük əhəmiyyətli; *This matter is of a paramount importance Bu məsələ çox böyük əhəmiyyət kəsb edir; Duty is paramount with him Vəzifə onun üçün əsasdır / birinci dərəcəlidir*; 2. ali, yüksək; **a ~ leader** ali rəhbər
**paramour** [ˈpærəmuəʳ] *n* oynaş; aşna
**paranoia** [pærəˈnɔɪə] *n tib.* paranoyya *(ruhi xəstəlik)*
**parapet** [ˈpærəpɪt] *n mem.* 1. hasar, məhəccər, sürahi; 2. *hərb.* sipər *(əsgərləri və topları düşmən atəşindən gizlətmək üçün səngərin üstündə düzəldilən torpaq sipəri)*
**paraphernalia** [ˌpærəfəˈneɪlɪə] *n* 1. şəxsi əmlak; 2. şəxsi şeylər *(bəzək şeyləri, geyim və s.)*; **~ of the gentle sex** qadın bəzək şeyləri və geyimləri
**paraphrase**[1] [ˈpærəfreɪz] *n* hekayə / nağıl etmə, öz sözü ilə demə / yazma / danışma
**paraphrase**[2] [ˈpærəfreɪz] *v* nağıl etmək, danışmaq *(öz sözü ilə)*; parafraz etmək / şəklinə salmaq
**parasite** [ˈpærəsaɪt] *n* 1. parazit, tüfeyli; **to live as a ~ on society** cəmiyyətdə parazit / tüfeyli kimi yaşamaq; 2. *biol.* parazit; **fleas, lice and other ~s** bitlər, birələr və başqa parazitlər
**parasitic** [ˌpærəˈsɪtɪk] *adj* 1. parazit, tüfeyli; **~ life** parazit / tüfeyli həyat; **~ plant** parazit bitki; 2. parazitlərin törətdiyi / yaratdığı / doğurduğu; **~ disease** parazitlərin törətdiyi xəstəlik

**parasitical** [ˌpærəˈsɪtɪkl] *adj* = **parasitic**
**parasitically** [ˌpærəˈsɪtɪkəlɪ] *adj* parazit / tüfeyli olaraq, parazit kimi
**parasitism** [ˈpærəsaɪtɪzm] *n* parazitlik, tüfeylilik
**parasitology** [ˌpærəsaɪˈtɒlədʒɪ] *n* parazitologiya *(parazitlərdən bəhs edən elm)*
**parasol** [ˌpærəˈsɒl] *n* 1. kiçik çətir *(günəşdən qorunmaq üçün)*; 2. *av.* parasol *(xüsusi quruluşlu monoplan)*
**paratroops** [ˈpærətru:ps] *n pl* paraşüt-desant qoşunları
**parboil** [ˈpa:bɔɪl] *v* 1. pörtmək, pörtlətmək, üstünə qaynar su tökmək, azca bişirmək; 2. *d.d.* tərləmək, istilənmək, pörtülmək *(istidən)*
**parcel**[1] [ˈpa:sl] *n* 1. boğça, bağlama; **a ~ of clothes** bir boğça paltar; **a ~ of books** bir bağlama kitab; *She was carrying a parcel of books in her hand O, əlində bir bağlama kitab aparırdı*; 2. posılka; *He got a parcel from his parents O, valideynlərindən bir posılka aldı*; 3. sahə *(torpaq haq.)*; *They own a cottage and a small parcel of land Onların bir daxması və bir parça torpaqları var*; 4. bir yığın / aləm; **a ~ of lies** bir aləm yalan; 5. *d.d.* pul məbləği *(xüs. udulmuş, və ya uduzulmuş)*; **to drop / to win a ~ over a race** cıdırda pul uduzmaq / udmaq;
**parcel**[2] [ˈpa:sl] *v* 1. hissələrinə ayırmaq / bölmək, xırdalamaq, parçalamaq, doğramaq *(həm də to ~ out)*; *He parcelled out the land into small plots O, torpağı xırda sahələrə ayırdı / böldü*; 2. bükmək, boğça halında bağlamaq; *She parcelled up the books O, kitabları büküb bağladı*
**parch** [pa:tʃ] *v* 1. bir az qızartmaq / qovurmaq; qurutmaq; **to ~ corn / peas** taxıl / noxud qovurmaq; 2. qurutmaq, qupquru etmək *(ot və s. haq.)*; 3. qurumaq *(dil, boğaz haq.)*; **to be ~ed with thirst** susuzluqdan ölmək; 4. şaxta vurmaq
**parched** [pa:tʃt] *adj* 1. qovrulmuş; **~ corn** *amer.* qovrulmuş qarğıdalı; 2. qurumuş; **grass ~ by the sun** günəşdən qurumuş ot; **lips ~ with fever** qızdırmadan qurumuş dodaqlar; 3. yanan *(susuzluqdan)*, bərk susayan; *Give me a drink, I'm parched Mənə bir az su ver / verin, yanıram*
**parchment** [ˈpa:tʃmənt] *n* 1. perqament *(1) qədimdə yazı üçün işlədilən heyvan dərisi; 2) perqament üzərində yazılan əl yazısı)*; 2. perqament kağızı; 3. kofenin qalığı
**pardon**[1] [ˈpa:dn] *n* 1. vidalaşma; xudahafizləşmə; 2. bağışlama, günahından / təqsirindən keçmə, əfv etmə; **to ask for ~** bağışlanılmanı xahiş etmək; *I beg your pardon!* 1) *Məni bağışla / bağışlayın!; Məni əfv et / edin!* 2) *Eşitmədim, zəhmət olmasa, təkrar et/edin!* 3. *hüq.* amnistiya, əfv edilmə, bağışlanma; **general ~** ümumi əfv / amnistiya; **the right of ~** bağışlama / əfv etmə hüququ; **to grant a ~** əfv etmək / bağışlamaq
**pardon**[2] [ˈpa:dn] *v* 1. bağışlamaq, əfv etmək; *Pardon me Məni bağışla / bağışlayın*; 2. *hüq.*

günahından keçmək, cəza verməmək; **to ~ smb. an offence** bir kəsin günahından keçmək / günahını bağışlamaq
**pardonable** ['pa:dnəbl] *adj* bağışlanıla bilən, üzürlü, bağışlanılacaq; **~ error / lie** bağışlanıla bilən səhv / yalan
**pare** [peə(r)] *v* **1.** kəsib qısaltmaq / gödəltmək; tutmaq, kəsmək *(dırnağı)*; **to ~ nails** dırnaqları tutmaq / kəsmək; **2.** qabığını soymaq / təmizləmək; **to ~ apples / potatoes** almanın / kartofun qabığını soymaq; **3.** azaltmaq, kəsmək *(həm də* **to ~ down / away / off)**; **to ~ down wages/salary** maaşı/əmək haqqını kəsmək/azaltmaq; **to ~ and prune expenses** xərcləri azaltmaq;
◊ **to ~ smb.'s claws** bir kəsin qol-qanadını sındırmaq / qırmaq
**parent** ['peərənt] *n* **1.** *(adət. pl)* valideyn; *Jane and Brown have become parents Ceyn və Braun valideyn olublar*; **spiritual ~** mənəvi valideyn; **2.** ulu baba, əcdad; **our first ~s** bizim əcdadlarımız / valideynlərimiz *(Adəm və Həvva)*; **3.** ana; **the ~ bird / tree** ana quş / ağac; **4.** mənbə, səbəb; **the ~ of evil** şərin / yamanlığın mənbəyi / səbəbi
**parentage** ['peərəntıdʒ] *n* **1.** atalıq, analıq, valideynlik; **2.** əsil, mənşə, şəcərə, nəsil şəcərəsi / tarixi; **of humble ~** kasıb / aşağı nəsildən; **a person of unknown ~** əsil-nəcabəti bilinməyən adam
**parental** [pə'rentl] *adj* valideynlik, atalıq, analıq; **~ authority** valideynlik nüfuzu; **~ love** valideynlik məhəbbəti; **~ care** valideynlik qayğısı; **children lacking ~ care/love** valideynlik qayğısı/məhəbbəti görməyən uşaqlar; **~ rights** valideynlik hüquqları
**parentheses** [pə'renθısi:z] *n* **parenthesis** *sözünün cəm forması*
**parenthesis** [pə'renθısıs] *n (pl* **-ses) 1.** *qram.* ara sözü / cümləsi; **2.** *pl* adi mötərizələr; **3.** interval; intermediya *(dram tamaşasının iki pərdəsi arasında oynanılan kiçik komik əsər)*
**parenthesize** [pə'renθısaız] *v* **1.** ara sözü / cümləsi əlavə etmək; **2.** mötərizəyə almaq
**parenthetic** [,pærən'θetık] *adj* **1.** mötərizəyə alınmış; **2.** ara; **~ remarks** ara qeydləri; *Parenthetic remarks should be short Ara qeydləri qısa olmalıdır*; **3.** ani, keçici; **~ glance** ani baxış
**parenthetical** [,pærən'θetıkl] *adj* = **parenthetic**
**parenthood** ['peərənthud] *n* valideynlik, valideyn olma
**parer** ['peərə(r)] *n* qabıq soymaq üçün bıçaq / maşın *(meyvənin, tərəvəzin və s.)*
**paring** ['peərıŋ] *n* **1.** təmizlik, təmizlənmə, soyma *(meyvə, tərəvəz haq.)*; qabıqdan çıxartma, arıtma; **2.** kəsmə, kəsib qısaltma; **3.** qabıq *(meyvədə)*
**park[1]** [pa:k] *n* **1.** park; **the Hyde Park** Hayd Park; **to stroll in the ~** parkda gəzmək / dolaşmaq; **2.** dayanacaq yeri *(maşınlar üçün)*
**park[2]** [pa:k] *v* **1.** park salmaq; **2.** park salmaq üçün sahə ayırmaq; **3.** dayanacağa qoymaq *(avtomobili və s.)*; **4.** *d.d.* qoymaq; tərk etmək; **to ~ one's hat in the hall** papağını dəhlizdə qoymaq
**parliament** ['pa:ləmənt] *n* **1.** parlament; **Act of Parliament** Parlament qanunu; **meeting of ~** parlament iclası; **to have a seat in ~** parlament üzvü olmaq; **to open Parliament** parlamentin iclasını təntənəli surətdə açmaq; **a Member of Parliament** parlament üzvü; *The issue was debated in Parliament Məsələ parlamentdə müzakirə edildi / olundu*; **the French / the German ~** fransız / alman parlamenti; **2.** parlament binası
**parliamentarian** [,pa:ləmən'teərıən] *n* **1.** parlament işinin yaxşı bilicisi; **2.** mahir parlament natiqi; **3.** parlament tərəfdarı *(XII əsrdə)*
**parliamentarism** [,pa:lə'mentərızm] *n* parlamentarizm *(parlamentli dövlət sistemi)*
**parliamentary** [,pa:lə'mentrı] *adj* parlament; **~ debates** parlament müzakirələri/mübahisələri; **~ committees** parlament komissiyaları
**parlor** ['pa:lə(r)] *n amer.* = **parlour**
**parlour** ['pa:lə(r)] *n* **1.** qonaq otağı *(şəxsi evlərdə)*; **2.** ayrıca otaq *(restoranlarda və s.)*; **3.** *amer.* atelye, salon, kabinə, otaq; **a beauty ~** gözəllik salonu; **an ice-cream ~** dondurmaxana, dondurma kafesi; **hair-dresser's ~** qadın salonu, dəlləkxana, bərbərxana; **massage ~** masaj otağı
**parlous** ['pa:ləs] *adj* təhlükəli, qorxulu; xatalı; dəhşətli, müdhiş; **~ times** dəhşətli vaxtlar; **the ~ state of international relations** beynəlxalq əlaqələrdə təhlükəli / qorxulu dövr; **a ~ journey** təhlükəli / xətalı səyahət
**parodist** ['pærədıst] *n* **1.** parodiya yazan, parodiya müəllifi; **2.** parodist, yamsılayan, təqlidçi
**parody[1]** ['pærədı] *n* parodiya *(bir əsərin gülməli təqlidi)*, istehza; **a ~ of a Shakespearian sonnet** Şekspirin bir sonetinə parodiya; *The trial was a parody of justice Məhkəmə ədalətin parodiyası idi, Məhkəmənin gedişi ədalət məhkəməsinə bir istehza idi*
**parody[2]** ['pærədı] *v* parodiya yazmaq; **to ~ a poem** şerə parodiya yazmaq
**parole[1]** [pə'roul] *n* **1.** vəd, vəd / şərti söz vermə; **prisoner on ~** şərti olaraq azad edilmiş dustaq; **to be put on ~** şərti azad olunmaq; **2.** *hərb.* əsirin müharibədə iştirak etməmək haqqında verdiyi iltizam / təəhhüd; **to break / to forfeit one's military ~** hərbi əməliyyatlarda iştirak etməmək haqqında təəhhüdünü pozmaq; **3.** parol *(hərbi xidmətdə və ya gizli təşkilatlarda öz adamlarını tanımaq üçün aralarında şərtləşdirilmiş məxfi söz)*
**parole[2]** [pə'roul] *v* **1.** *hərb.* əsiri şərti olaraq azad etmək; **2.** *amer.* dustağı şərti olaraq azad etmək
**paroxysm** ['pærəksızm] *n tib.* tutma; paroksizm *(xəstəliyin vaxtaşırı təkrar olunması, qəfildən tutması)*; **~ of coughing** öskürəyin vaxtaşırı tutması
**parquet[1]** ['pa:keı] *n* parket
**parquet[2]** ['pa:keı] *v* parket vurmaq
**parricide** ['pærısaıd] *n* **1.** ata / ana qatili, öz atasını / anasını öldürən; **2.** atanı / ananı öldürmə; **3.** vətən xaini
**parrot[1]** ['pærət] *n* **1.** *zool.* tutuquşu; **2.** özgənin sözlərini təkrar edən şəxs / adam
**parrot[2]** ['pærət] *v* özgələrin hərəkətini / sözlərini fikirləşmədən tutuquşu kimi təkrar etmək
**parry[1]** ['pærı] *n id.* **1.** qaytarma, dəf etmə *(boksda müdafiə üsulu)*; **2.** *id.* müdafiə *(qılıncoynatmada)*
**parry[2]** ['pærı] *v (pt, pp* **parried) 1.** *id.* zərbəni / hücumu dəf etmək; **2.** *məc.* rədd etmək; etiraz etmək; **to ~ a question** sualdan qaçmaq, suala sualla cavab vermək; **3.** qaçmaq, kənar gəzmək *(bir şeydən)*; *He always parries disagreeable affair O həmişə mübahisəli / cəncəl məsələlərdən qaçır / kənar gəzir*
**parse** [pa:z] *v* qrammatik təhlil etmək *(nitq hissələrinə görə)*
**parsimonious** [,pa:sı'mounjəs] *adj* **1.** qənaətcil, qənaətkar, yığıcı; xəsis; **2.** kasıb, yazıq, zavallı, biçarə, binəva; az; cüzi; **~ fare** az / cüzi xörək
**parsimoniously** ['pa:sımounjəslı] *adv* qənaətcilliklə, qənaətkarcasına; xəsisliklə, dargözlüklə
**parsimony** ['pa:sımənı] *n* **1.** qənaətcillik, qənaətkarlıq, yığıcılıq, yığımcıllıq; qənaət, qənaət etmə / edilmə; **2.** xəsislik, simiclik; dargözlük
**parsley** ['pa:slı] *n bot.* cəfəri
**parsnip** ['pa:snıp] *n bot.* cır havuc;
◊ *Fine / Fair words butter no parsnip at. söz. Halva, halva deməklə ağız şirin olmaz*
**part[1]** [pa:t] *n* **1.** hissə, qisim; **~s of a book** kitabın hissələri; *Some parts of this book are interesting Bu kitabın bəzi hissələri maraqlıdır*; **~s of the human body** insan bədəninin hissələri; *Which part of your leg hurts Qıçının / Qıçınızın hansı hissəsi incidir?*; **~ of the job** işin hissəsi / qismi; *We've finished the difficult part of the job Biz işin çətin hissəsini qurtarmışıq*; **~s of a machine** maşın hissələri; **~s of speech** nitq hissələri; *How many parts of speech are there in English İngilis dilində neçə nitq hissəsi var?*; **greater ~ of the population** əhalinin böyük / əksər hissəsi; **2.** vəzifə, iş, funksiya; *It's no part of parents Bu, valideynlərin vəzifəsi / işi deyil*; **to take / to have ~ in smth.** bir şeydə iştirak etmək; **to take ~ in conversation** söhbətdə iştirak etmək; *I had no part in it Mən bunda iştirak etməmişəm*; **to do one's ~** öz işini görmək; **to take ~ in the action** əməliyyatda iştirak etmək; **3.** rol, partiya; **to act / to play the ~** rol oynamaq; *He was excellent in the part of Hamlet O, Hamlet rolunu/partiyasını əla oynadı*; **4.** tərəf; **for my ~** mənim tərəfimdən, mənə gəldikdə; *There was no objection on the part of the author Müəllif tərəfindən heç bir etiraz olmadı; For my part I know nothing about him Mənə gəldikdə, mən onun haqqında heç nə bilmirəm*; **5.** *adət. pl* yer, ölkə; **in foreign ~s** yad ölkələrdə; *We are from the same parts Biz yerliyik*; **in these ~s of the world** bu yerlərdə, dünyanın bu yerlərində;
◊ **~ and parcel** tərkib / ayrılmaz hissə; *This is part and parcel of my subject Bu mənim mövzumun tərkib hissəsidir*
**part[2]** [pa:t] *v* **1.** bölmək; ayırmaq; aralanmaq; *The island parts the river into two branches Ada, çayı iki qola bölür / ayırır; The war parted many men from their families Müharibə çox adamları ailələrindən ayırdı*; **to ~ one's hair in the middle** saçını ortadan ayırmaq; *He parts his hair in the middle O, saçını ortadan ayırır; The clouds parted and the sun shone Buludlar aralandı və günəş parladı*; **2.** ayrılmaq; *She has parted from her husband O, ərindən ayrılıb; She and her husband have parted O və əri ayrılıblar*; **3.** aralamaq; **to ~ fighters** dalaşanları aralamaq /ayırmaq; **4.** seçmək, fərqləndirmək; **to ~ error from crime** səhvi cinayətdən seçmək/ fərqləndirmək; **to ~ from** ayrılmaq, xudahafizləşmək;
◊ **to ~ company (with) 1)** ayrılmaq; **2)** incişmək; **3)** razılaşmamaq, fikir ayrılığına malik olmaq, başqa-başqa fikirdə olmaq; *On that question I part company with you O məsələdə biz səninlə / sizinlə başqa-başqa fikirdəyik*
**partake** ['pa:teık] *v (pt* **partook**; *pp* **partaken) 1.** birgə iştirak etmək; **to ~ in the social life of the village** kəndin ictimai həyatında birgə iştirak etmək; *They partook of our triumph Onlar bizim təntənəmizdə iştirak etdilər*; **2.** yemək, dadmaq, dadına baxmaq; **to ~ of a meal** nahar etmək, səhər yeməyi yemək; *He partook rather freely O, yaxşıca / kifayət qədər yedi*
**partaken** ['pa:teıkn] **to partake** *felinin pt forması*
**partaker** ['pa:teıkə(r)] *n* iştirakçı, iştirak edən
**partaking** [pa:'teıkıŋ] *n* iştirak, iştirak etmə
**parted** ['pa:tıd] *adj* **1.** ayrılmış, ayrılan; **~ hair** ayrılmış saç; **2.** bir-birindən ayrılmış, ayrı salınmış
**partial** ['pa:ʃl] *adj* **1.** yarımçıq, natamam; qismən; **~ success** cüzi/ yarımçıq müvəffəqiyyət; **~ eclipse** *astr.* qismən tutulma; **a ~ eclipse of the sun / of the moon** günəşin / ayın qismən tutulması; **~ nuclear test ban** atom silahının sınağının qismən qadağan edilməsi; **~ reaction** *kim.* natamam reaksiya; **2.** qərəzli, qərəzkar; ədalətsiz; **~ opinion / witness** qərəzli fikir / şahidlik; **3.** həvəs / meyl göstərən, xoşu gələn, meyli olan; **to be ~ to smth. / to smb.** bir şeyə / kəsə meyl göstərmək; *I am partial to a pipe after dinner Nahardan sonra mən qəlyan çəkməyə meylliyəm*

**partiality** [ˌpa:ʃɪˈælɪtɪ] *n* **1.** qərəzlilik; natamamlıq, yarımçıqlıq; *He judged the case without partiality O, məsələyə qərəzsiz yanaşdı*; **2.** tərəfgirlik, üzgörənlik, qərəz; **3. (to, for, towards)** meyl, arzu, həvəs; **to be ~ to / for** ***smth.*** bir şeyə meylli olmaq, xoşu gəlmək, sevmək *(bir şeyi)*; *She has a partiality for French cheese Onun fransız pendirindən xoşu gəlir (yəni fransız pendirini yeməyi sevir)*

**partially** [ˈpa:ʃəlɪ] *adv* **1.** yarı, qismən, natamam; *The road was partially blocked by the fallen tree Yıxılan ağac yolu qismən kəsmişdi*; **2.** qərəzlə, qərəzkarlıqla, tərəfgirliklə, tərəfkeşliklə; **to act ~** qərəzkarlıqla/üzgörənliklə hərəkət etmək

**participant** [pa:ˈtɪsɪpənt] *n* iştirakçı, iştirak edən; *All the participants in the debate had an opportunity to speak Müzakirə iştirakçılarının hamısının danışmağa imkanı oldu*

**participate** [pa:ˈtɪsɪpeɪt] *v* **1.** iştirak etmək; **to ~ in** ***smth.*** bir şeydə iştirak etmək; **to ~ in a conversation** danışıqda iştirak etmək; **to ~ in a discussion** müzakirədə iştirak etmək; **to ~ in a crime** cinayətdə iştirak etmək; **2.** bölüşdürmək; **to ~ in** ***smb.'s*** **joy** bir kəsin sevincini bölüşdürmək

**participation** [pa:ˌtɪsɪˈpeɪʃn] *n* iştirak, iştirak etmə; **~ in a crime** cinayətdə iştirak etmə

**participator** [pa:ˈtɪsɪpeɪtəʳ] *n* iştirakçı, iştirak edən; **a ~ in the crime** cinayətdə iştirak edən, cinayətin iştirakçısı

**participial** [ˌpa:tɪˈsɪpɪəl] *adj qram.* feli sifət; **~ constructions** feli sifət tərkibləri

**participle** [ˌpa:tɪˈsɪpl] *n qram.* feli sifət; **present / past ~** indiki / keçmiş zaman feli sifəti

**particle** [ˈpa:tɪkl] *n* **1.** zərrəcik, zərrə, bir zərrə, bir az, cüzi miqdarda; **~s of dust, dust ~s** toz zərrəcikləri; *There's not a particle of truth in her story Onun hekayəsində bir zərrə də həqiqət yoxdur*; **2.** *qram.* ədat; **3.** *fiz* hissəcik

**particular¹** [pəˈtɪkjuləʳ] *n* **1.** təfsilat, təfərrüat, xüsusiyyət; **to execute** ***smb.'s*** **order in every ~** bir kəsin sərəncamını / əmrini təfsilatı ilə yerinə yetirmək; **to go into ~s** təfərrüata varmaq; **without entering into ~s** təfərrüatlara varmadan; **2.** ətraflı hesabat; **to give all the ~s of** ətraflı hesabat vermək; *Her account is correct in every particular Onun hesabatı hər bir cəhətdən doğrudur / düzdür*; **3.** *d.d.* yaxın dost, istəkli, sevimli

**particular²** [pəˈtɪkjuləʳ] *adj* **1.** xüsusi, ayrı, ayrıca, əlahiddə; spesifik; **a ~ case** xüsusi / ayrıca hal; *Why did you choose this particular subject? Nə üçün sən / siz xüsusi olaraq bu fənni / mövzunu seçdin / seçdiniz?*; **at this ~ time** məhz / xüsusən bu vaxt; **to do** ***smth.*** **in a ~ way** bir işi xüsusi bir yolla etmək; **2.** müstəsna, qeyri-adi, xüsusi olaraq; **to take ~ care over doing** ***smth.*** bir şeyi etməyə müstəsna / əlahiddə qayğı göstərmək; **to have a ~ dislike for** ***smb.*** bir kəsə qarşı xüsusi ədavət / düşmənçilik bəsləmək; **3.** fərdi, şəxsi, ayrıca; **my own ~ sentiment** mənim şəxsi hissim / dərk etməyim /təəssüratım; *I cannot fasten this statement to any particular person Mən bu müddəanı xüsusi olaraq heç kəsin adına yaza bilmirəm*; **4.** ətraflı, müfəssəl, təfsilatlı, hərtərəfli; **full and ~ account** tam və ətraflı hesabat; **5.** diqqətli, səliqəli, əsaslı; **to be ~ in** ***one's*** **speech** nitqində / danışığında diqqətli olmaq; **6.** tələbkar, vasvası; **to be ~ about** ***one's*** **food** yeməyində vasvası olmaq; *Don't be too particular Çox vasvası olma / olmayın*

**particularity** [pəˌtɪkjuˈlærɪtɪ] *n* **1.** xüsusiyyət, başqalıq, özünə xas xüsusiyyət, spesifika; vasvasılıq; **2.** təfsilat, təfərrüat; **3.** diqqət, mükəmməllik; ətraflılıq, təfsilat, dolğunluq

**particularise** [pəˈtɪkjuləraɪz] *v* = **particularize**

**particularize** [pəˈtɪkjuləraɪz] *v* **1.** bir-bir saymaq, sadalamaq, bir-bir adını çəkmək; adbaad çağırmaq; *Certain persons I do not wish to particularize Bəzi adamların mən adını çəkmək istəmirəm*; **2.** təfərrüata varmaq, təfərrüatla öyrənmək; *We had no time to particularize Təfərrüata varmaq üçün bizim vaxtımız yox idi*

**particularly** [pəˈtɪkjuləlɪ] *adv* **1.** olduqca, çox, fövqəladə, son / müstəsna dərəcədə, xüsusən, xüsusi olaraq; *I like all her novels, but her latest is particularly good Mən onun bütün romanlarını xoşlayıram, lakin onun son romanı olduqca yaxşıdır*; *I don't particularly want to see him today Mən bu gün onu çox da görmək istəmirəm*; **2.** ətraflı, müfəssəl surətdə, təfsilatı ilə, təfərrüatı ilə; *The facts must be considered more particularly Faktlar daha ətraflı öyrənilməlidir*; **3.** şəxsən, ayrıca olaraq; *He studies astronomy and planets particularly O, astronomiya ilə məşğuldur və xüsusən planetləri öyrənir*

**parting¹** [ˈpa:tɪŋ] *n* **1.** ayrılma, vidalaşma, vidalaşaraq ayrılma, ayrılıq; **the sadness of ~** ayrılığın kədəri / qəmi; **their final ~** onların son ayrılığı; **2.** aralanma; **the ~ of the clouds** buludların aralanması; **3.** ayırma, darama *(saçı)*; **a side / centre ~** yana / ortadan ayırma *(saçı)*; **4.** yolayrıcı *(həm də məc.)*

**parting²** [ˈpa:tɪŋ] *adj* **1.** ayrılıq, vida; **a ~ kiss** vida öpüşü; **2.** ayrılan, haçalanan *(yol və s.)*; **3.** ötüb gedən, sona çatan; **~ day** ötüb gedən / sona çatan gün

**partisan¹** [ˌpa:tɪˈzæn] *n* **1.** tərəfdar, havadar; **~ of the reform** islahat tərəfdarı; **~s of peace** sülh tərəfdarları; **2.** partizan, partizan dəstəsinin komandiri

**partisan²** [ˌpa:tɪˈzæn] *adj* **1.** partizan; **~ war** partizan müharibəsi; **~ party** partizan dəstəsi; **2.** fanatik, fanatikcəsinə; tərəfgir, üzgörən, qərəzli, qərəzkar; kor-koranə inanan; **~ views** qərəzli / qərəzkar fikirlər



**partisanship** [ˌpa:tɪˈzænʃɪp] *n* **1.** kor-koranə sədaqət / tərəfdarlıq; **2.** qızğın müdafiə etmə / tərəfini saxlama; **~ of the party** partiyanın tərəfini saxlama, partiyanı müdafiə etmə

**partition¹** [pa:ˈtɪʃn] *n* **1.** bölünmə, ayrılma; **the ~ of Germany after the war** müharibədən sonra Almaniyanın bölünməsi; **2.** hissə, bölmə; **3.** arakəsmə, yüngül divar

**partition²** [pa:ˈtɪʃn] *v* **1.** bölmək; ayırmaq; **to ~ an inheritance** mirası bölmək; **2.** arakəsmə qoymaq, arakəsmə ilə ayırmaq; **3.** vermək, paylamaq *(həm də* **to ~ out***)*; *She partitioned out her books O, kitablarını payladı*; **to ~** ***smth.*** **off** bir şeyi bölüb ayırmaq; *We've partitioned off one end of the kitchen to make a breakfast room Səhər yeməyi otağı düzəltmək üçün biz mətbəxin bir tərəfini kəsib ayırdıq*

**partitive** [ˈpa:tɪtɪv] *adj qram.* **1.** bölüşdürmə; **~ conjunctions** bölüşdürmə bağlayıcıları; **2.** kəsr; **3.** xüsusi, şəxsi

**partly** [ˈpa:tlɪ] *adv* qismən, bir qədər, bir hissə; **~ in writing and ~ in print** bir hissə əllə yazılmış və bir hissə çap olunmuş; *He is partly right O, qismən haqlıdır*

**partner¹** [ˈpa:tnəʳ] *n* **1.** iştirakçı, iştirak edən; **a ~ in crime** cinayət iştirakçısı, cinayətdə iştirak edən; **2.** kompanyon, ortaq, şərik, yoldaş; **3.** ər, arvad *(həm də* **~ in life***)* həyat yoldaşı; **4.** partnyor, oyundaş *(idmanda, rəqsdə, səhnədə və s.)*; **to go ~s** partnyor olmaq *(rəqsdə)*

**partner²** [ˈpa:tnəʳ] *v* partnyor olmaq

**partnership** [ˈpa:tnəʃɪp] *n* **1.** iştirak, iştirak etmə; **2.** yoldaşlıq, cəmiyyət

**partook** [pa:ˈtuk] **to partake** *felinin pt forması*

**part-owner** [ˈpa:tˌounəʳ] *n* şərik, ortaq

**partridge** [ˈpa:trɪdʒ] *n zool.* kəklik

**party¹** [ˈpa:tɪ] *n* **1.** qonaqlıq; **a birthday ~** ad günü qonaqlığı; **a dinner ~** nahar qonaqlığı; *She likes parties, because she enjoys meeting people O, qonaqlıqları xoşlayır, çünki o, insanlarla görüşdən həzz alır*; **2.** partiya; *The main political parties in the United States are the Democrats and the Republicans Birləşmiş Ştatlarda əsas siyasi partiyalar Demokratlar və Respublikaçılardır*; **to join a ~** partiya sıralarına qoşulmaq, partiyaya girmək / daxil olmaq; **to belong to a ~** bir partiyaya mənsub olmaq, bir partiyanın üzvü olmaq; **3.** qrup, dəstə; **a ~ of schoolchildren/ tourists** bir qrup məktəb uşağı / turist

**party²** [ˈpa:tɪ] *adj* partiya; **~ card** partiya bileti; **the ~ leader** partiya rəhbəri / başçını; **~ organization** partiya təşkilatı; **~ interest / members** partiya marağı / üzvləri; **the ~ system** partiya sistemi; **~ dues** partiya üzvülük haqqı; **~ warfare** partiyanın mübarizəsi, partiyalar arasında mübarizə

**party³** [ˈpa:tɪ] *v (pt, pp* **partied***)* qonaqlığa getmək, qonaqlıqdan həzz almaq

**pass¹** [pa:s] *n* I **1.** *id.* pas, ötürmə; **a long ~** uzun pas / ötürmə; **a short ~** yaxın pas / ötürmə; **2.** keçid; yol; *The pass was blocked by snow Keçidi qar basmışdı / kəsmişdi; The guide showed us the pass through the wood Bələdçi meşədən keçən yolu bizə göstərdi*; **3.** dar küçə, döngə, dalan; **a narrow ~ with low houses** alçaq evləri olan dar dalan; **4.** dərə, dar dərə; **5.** ölüm, ölmə; **a sudden ~** gözlənilməz / qəfil ölüm

**pass** [pa:s] *n* II **1.** fərqlənmədən imtahan vermə; **2.** kafi qiymət; *She got a bare pass O, ancaq kafi qiymət aldı*; **3.** vəziyyət; **to be at a critical ~** çətin vəziyyətdə olmaq; **to bring to ~** qurtarmaq, həyata keçirmək; **to come to ~** baş vermək; **4.** fokus; **to perform a ~** fokus göstərmək

**pass** [pa:s] *n* III **1.** pasport, icazə vərəqəsi; *He got his pass and health certificate O, pasportunu və sağlamlıq haqqında arayışını aldı*; **2.** *amer.* qısa müddətli məzuniyyət; **a soldier on a ~** qısa müddətli məzuniyyəti olan əsgər; **3.** pulsuz bilet

**pass²** [pa:s] *v* **1.** keçmək; getmək; keçib / ötüb getmək; **to ~ a barrier** maneəni keçmək; *The street was so crowded that cars were unable to pass Küçə adamla elə dolu idi ki, maşınlar keçib gedə bilmədilər; Turn right after passing the Post Office Poçtu keçdikdən sonra sağa dön / dönün; She passed me in the street without even saying hello O, küçədə mənim yanımdan ötüb keçdi, heç salamlaşmadı da; We passed from the corridor into a large hall Biz dəhlizdən keçdik və böyük bir zala girdik / daxil olduq*; **2.** taxmaq, keçirmək; **to ~ a thread through the eye of a needle** sapı iynənin gözündən (deşiyindən) keçirmək; **3.** ötürmək, vermək; *Pass me the salt, please Zəhmət olmasa, duzu mənə ver / verin; Pass me that book O kitabı mənə ver / verin*; **4.** *id.* ötürmək *(topu, şaybanı və s.)*; *He passed the ball forward O, topu irəli ötürdü*; **5.** keçmək, keçib getmək *(vaxt haq.)*; soyumaq *(acıq, qəzəb)*; *A fortnight passed İki həftə keçdi / keçib getdi; How quick time passes Vaxt nə tez gedir / keçir; The pain soon passed Ağrı tezliklə keçib getdi / keçdi; His anger soon passed Onun qəzəbi / hirsi tezliklə soyudu*; **6.** hərəkətə eyni hərəkətlə cavab vermək, mübadilə etmək; **to ~ greetings** bir-birini salamlamaq; **7.** keçirmək *(vaxt və s.) (həm də* **to ~ away***)*; **to ~ the time** vaxt keçirmək; **to ~** ***one's*** **time in sleep** vaxtını yatmaqda keçirmək; **to ~ the summer in the south** yayı cənubda keçirmək; **8.** çıxartmaq, qəbul etmək *(hökm, qərar)*; **to ~ sentence upon** ***smb.*** bir kəs haqqında hökm çıxartmaq; *The judge passed the sentence Hakim hökm çıxartdı*; **9.** fikir / rəy söyləmək; **to ~ an opinion on / upon** ***smth.*** bir şey haqqında fikir söyləmək / bildirmək; *I can't pass an opinion on his work without examining it thoroughly Mən onun işini ətrafl*

*dərindən yoxlamadan onun haqqında fikir söyləyə bilmərəm;* 10. dövriyyəyə buraxmaq *(saxta pul); He was arrested for passing forged notes Onu dövriyyəyə saxta pul buraxdığı üçün həbs etdilər;* 11. sarımaq, bağlamaq *(kəndirlə);* **to ~ rope round a pack** tayı kəndirlə bağlamaq; *They passed a rope round the calf's hind legs Onlar dananın dal ayaqlarını bağladılar / sarıdılar;* 12. *amer.* açmaq *(açarla); All these doors should be passed with one key Bu qapılar hamısı bir açarla açılmalıdır;* 13. soxmaq, sancmaq, sancıb/soxub deşmək *(qılıncla, xəncərlə); He passed his sword through his enemy's body O, qılıncını düşmənin bədəninə soxdu;* **to ~ away 1)** ölmək; rəhmətə getmək; *He passed away at the age of ninety O, doxsan yaşında öldü / rəhmətə getdi;* **2)** yox olmaq, qurtarmaq, keçib getmək; *Thus passed the winter rapidly away Beləliklə qış sürətlə keçib getdi;* **3)** vaxt keçirmək; **to ~ in 1)** vermək, təqdim etmək; *He passed in his papers and sat down to wait O, sənədlərini verdi / təqdim etdi və oturub gözlədi;* **to ~ off 1)** kəsmək, dayanmaq, azalmaq; *The pain has not passed off yet Ağrı hələlik kəsməyib / dayanmayıb; The storm has passed off Tufan kəsib;* **2)** keçmək; *The lecture passed off well Mühazirə yaxşı keçdi; The talks have passed off smoothly Danışıqlar sakit / rahat keçib;* **3)** özünü göstərmək / qələmə vermək; *He passed himself off as a sailor O, özünü dənizçi kimi qələmə verdi;* **to ~ on 1)** ötüb keçmək / getmək; *He bowed and passed on O, baş əydi və ötüb getdi;* **2)** ötürmək; *Read the note and pass it Kağızı oxu / oxuyun və ötür / ötürün;* **3)** keçmək; *Let's pass on to the next item on the agenda Gəl / Gəlin gündəliyin növbəti / o biri bəndinə keçək;* **to ~ out 1)** *d.d.* ölmək; *He passed out on the way to the hospital O, xəstəxanaya aparılarkən yolda öldü;* **2)** yox olmaq, itmək *(gözdən);* **to ~ out of sight** gözdən itmək; **3)** yaymaq, paylamaq; *On that day she passed out 100 leaflets O gün o, 100 vərəqə yaydı / payladı;* **4)** yeni/başqa məsələyə keçmək; *They had passed on to a new subject Onlar başqa məsələyə keçdilər;* **to ~ over 1)** keçmək; **to ~ over the river** çayı keçmək; **2)** diqqətdən kənarda saxlamaq, diqqət verməmək, laqeyd qalmaq; **to ~ over the details** təfərrüata varmamaq, təfərrüata diqqət yetirməmək; **3)** ölmək; *His mother passed over some days ago Onun anası bir neçə gün bundan əvvəl öldü;*

◊ **to ~ *one's* eye / glance over *smth.*** bir şeyə nəzər salmaq, bir şeyi nəzərdən keçirmək; *Pass your eyes over this article Bu məqaləni nəzərdən keçir / keçirin;* **to ~ *one's* promise** vəd vermək; **to ~ *one's* word** söz vermək; **to ~ *one's* word for *smth.* / *smb.*** bir şeyə / kəsə zamin olmaq; **to ~ the lips** demək, söyləmək; *Don't let it pass your lips Bu barədə bir kəlmə də demə / deməyin; No complaints passed his lips O, heç şikayət etmədi; No food has passed my lips since the morning Səhərdən ağzıma heç nə dəyməyib (yəni heç nə yeməmişəm);* **to ~ troops in review** orduya baxış keçirmək; **to ~ events in review** hadisələrin icmalını vermək

**passable** ['pa:səbl] *adj* **1.** keçilə bilən, keçilməsi mümkün olan; **~ ground** keçilməsi mümkün olan yer; *The mountain roads are not passable until late spring Yazdan xeyli keçənə qədər dağ yolları keçilməz olur;* **2.** yaxşı, kifayət edəcək dərəcədə; **a ~ knowledge of French** fransız dilini yaxşı bilmə; **3.** işlənən, tədavüldə olan; *This coin is no longer a passable thing Bu sikkə artıq işlənmir / tədavüldən çıxıb*

**passage** ['pæsɪdʒ] *n* **1.** ötmə, ötüb keçmə, sovuşma; **the ~ of the time** vaxtın ötüb keçməsi; **2.** gediş; **the ~ of events** hadisələrin gedişi; **3.** koridor; dəhliz; **4.** aşırım, dağ keçidi; *These mountains have few passages Bu dağlarda keçid azdır;* **5.** yol; keçid; **a ~ through a thicket** cəngəlliyin içərisindən yol / keçid; *They were denied passage through the occupied territory Onlara işğal olunmuş ərazidən yol vermədilər;* **6.** giriş; **a ~ into a bay** buxtaya giriş; **7.** parça, hissə, yer *(kitabda, məqalədə və s.); His paper contains brilliant passages Onun məruzəsində çox yaxşı yerlər / hissələr var;* **8.** gediş haqqı *(gəmidə, təyyarədə);* **to book *one's* ~ to New York** Nyu Yorka getmək üçün bilet almaq *(gəmi ilə);* **9.** gəmi ilə, təyyarə ilə gediş; **free ~** pulsuz gediş *(dənizlə)*

**passenger$^{1}$** ['pæsɪndʒə$^{r}$] *n* **1.** sərnişin; **to carry ~s** sərnişin daşımaq; *The driver was killed in the crash but both passengers escaped unhurt Qəzada sürücü öldü, lakin sərnişinlərin hər ikisi zədə almadan ötüşdülər;* **2.** komandanın və ya ekipajın zəif üzvü

**passenger$^{2}$** ['pæsɪndʒə$^{r}$] *adj* sərnişin; **~ train** sərnişin qatarı; **~ boat** sərnişin qayığı; **~ ship** sərnişin gəmisi; **the ~ seat** sərnişin oturacağı; **~ car** sərnişin vaqonu; yüngül avtomobil

**passer-by** [.pa:sə'baɪ] *n (pl* **passers-by***)* yoldan ötən / keçən, yolçu

**passing$^{1}$** ['pa:sɪŋ] *n* **1.** ötmə, keçmə, ötüb keçmə; **the ~ of the time** zamanın ötməsi / ötüb keçməsi; **2.** *şair.* ölüm; ölənlər; *The country mourns his passing Ölkə ölənlərə yas saxlayır;* **3.** keçid, bərə; **4.** *d.y.* ehtiyat yol; **5.** *id.* ötmə, ötüb keçmə; **~ the baton** estafet ağacını vermə;

◊ **in ~** sözarası, yeri gəlmişkən

**passing$^{2}$** ['pa:sɪŋ] *adj* **1.** ötəri; ötüb gedən / keçən, ani; **~ glance** ötəri / ani nəzər; **~ thought** ötəri fikir; **2.** təsadüfi; **~ reference** təsadüfi xatırlama; **~ greetings** dayanmadan salamlaşma; **the ~** dilucu; **to mention *smth.* in ~** bir şeyi dilucu xatırlamaq



**passing-by** ['pa:sɪŋ'baɪ] *n* saymazlıq, etinasızlıq, diqqətsizlik, etinasızlıq / diqqətsizlik göstərmə

**passion** ['pæʃn] *n* **1.** ehtiras; böyük həvəs / maraq, şövq; **tender ~** zərif ehtiras; **a man of violent ~s** dəlicəsinə ehtiraslı adam; **to master *one's* ~** ehtirasını cilovlamaq; **burning ~** alovlu / qızğın ehtiras; *The poet expressed his burning passion for the girl he loved Şair sevdiyi qıza olan alovlu ehtirasını ifadə etdi; Passions were running high at the meeting İclasda ehtiraslar coşmuşdu;* **2.** coşğunluq, qızğınlıq; *His style lacks passion Onun üslubunun coşğunluğu yoxdur;* **3.** vurğunluq, bənd olma, çox sevmə; *His passion for the girl made him blind to everything else Qıza vurğunluğundan o, başqa heç nə görmürdü;* **to have a ~ for tennis / football / music, *etc.*** tennisə / futbola / musiqiyə və s. vurğun olmaq, tennisi / futbolu / musiqini çox sevmək; **4. the Passion** *din.* İsanın əzabı və ölümü;

◊ **to fly into ~** qəzəblənmək, qəzəbdən alovlanmaq / alovlanıb yanmaq

**passionate** ['pæʃənɪt] *adj* **1.** qızğın, ehtiraslı, alovlu, hərarətli, həvəsli; **a ~ woman** ehtiraslı qadın; **a ~ kiss / lover** ehtiraslı öpüş / aşiq; **a ~ speech** ehtiraslı / alovlu nitq; **a ~ defender of liberty / peace / independence, *etc.*** azadlığın / sülhün /müstəqilliyin *və s.* qızğın / alovlu müdafiəçisi; **2.** qəzəbli, qeyzli, hiddətli; azğın, coşğun; qudurğan; **3.** çılğın; **men of ~ temper** çılğın adamlar

**passionately** ['pæʃnɪtlɪ] *adv* ehtirasla, şövqlə, həvəslə, çox bərk; **to love ~** ehtirasla sevmək; *He loved the girl passionately O, qızı bərk / çox / ehtirasla sevirdi*

**passion-flower** ['pæʃn.flauə$^{r}$] *n bot.* həvəsçiçək *(iri al çiçəkləri olan tropik bitki)*

**passionless** ['pæʃnlɪs] *adj* ehtirassız, həvəssiz, şövqsüz, soyuq, soyuqqanlı, təmkinli; **a ~ performance** ehtirassız tamaşa

**passive** ['pæsɪv] *adj* **1.** passiv, fəaliyyətsiz, hərəkətsiz, süst, laqeyd; **to remain ~** fəaliyyətsiz / hərəkətsiz qalmaq; *I'm passive in their disputes Mən onların mübahisəsinə qarışmıram, Mən onların mübahisəsində iştirak etmirəm;* **2.** itaətli, itaətkar, sözə baxan / qulaq asan, üzüyola; **3.** *qram.* növ; **~ voice** məchul növ; **4.** *mal.* faizsiz; **~ balance** passiv saldo, qalıq *(gəlir və çıxar yekunları arasındakı fərq);* **~ bonds** *amer.* faizsiz istiqraz; **~ debt** faizsiz ödənilən borc

**passively** ['pæsɪvlɪ] *adv* passiv / laqeyd surətdə, süst, laqeydliklə, laqeydcəsinə

**passiveness** ['pæsɪvnɪs] *n* = **passivity**

**passivity** [pæ'sɪvɪtɪ] *n* **1.** passivlik, fəaliyyətsizlik, süstlük, laqeydlik; **2.** itaətkarlıq, itaətlilik, sözəbaxanlıq

**passless** ['pa:slɪs] *adj şair.* keçilməz, keçilməsi mümkün olmayan

**passman** ['pa:smən] *n (pl* -men [-men]*)* fərqlənməyən təqaüd və ya diplom alan tələbə

**passover** ['pa:s.ouvə$^{r}$] *n* keçid; aşırım, dağ keçidi; *We stopped at the foot of the passover Biz aşırımın / keçidin ətəyində dayandıq*

**passport$^{1}$** ['pa:spɔ:t] *n* **1.** pasport; **diplomatic ~** diplomatik pasport; **2.** *məc.* açar; *The only passport to success is hard work Qələbənin yeganə açarı gərgin işdir*

**passport$^{2}$** ['pa:spɔ:t] *v* pasport vermək, pasportla təmin etmək

**passway** ['pa:sweɪ] *n* keçid; *There's only one passway through the hills Bu dağların arasından ancaq bircə keçid var*

**password** ['pa:swə:d] *n hərb.* parol *(şərtləşdirilmiş söz),* icazə vərəqəsi

**past$^{1}$** [pa:st] *n* **1.** keçmiş; **in the ~** keçmişdə; *I've been there many times in the past Keçmişdə mən dəfələrlə orada olmuşam; We know nothing of his past Biz onun keçmişi haqqında heç nə bilmirik;* **2.** keçmişdə baş vermiş; **memories of the ~** keçmişin xatirələri; **3.** *qram.* keçmiş zaman

**past$^{2}$** [pa:st] *adj* **1.** keçmiş, keçən; **~ happiness** keçmiş/ötüb getmiş xoşbəxtlik; **~ week / month / year / century** keçən həftə / ay / il / əsr; *He is past his prime Onun gəncliyi ötüb keçib;* **2.** *qram.* keçmiş; **~ tense** keçmiş zaman; **~ participle** keçmiş zaman feli sifəti

**past$^{3}$** [pa:st] *adv* yanından, yaxından, yaxınından; **to go / to run ~** yanından / yaxınından getmək / qaçmaq; *The years flew past İllər ötüb getdi*

**past$^{4}$** [pa:st] *prep* **1.** sonra, gec; **~ midnight** gecəyarıdan / gecənin yarısından sonra; *He stayed up till past eleven o'clock O, saat on birdən sonra yatdı;* **2.** yanından, yaxınlığından; **to walk ~ *smb.* / *smth.*** bir kəsin / şeyin yanından keçib getmək; **3.** o yanda / tərəfdə; **~ the bridge** körpüdən o tərəfdə / yanda; **4.** -dan, -dən, artıq; *He is past forty Onun yaşı qırxdan artıqdır;* **~ cure** sağalmaz, müalicəsiz, müalicə olunmaz; **a malady ~ cure** müalicə olunmaz xəstəlik; **~ belief 1)** inanılmayacaq dərəcədə, son dərəcə; fövqəladə; **2)** ağlagəlməz, ağlasığmayan, inanılmaz; *It's past belief my comprehension Bunu mən dərk edə bilmirəm;* **~ bearing** dözülməz, qatlaşılmaz, son dərəcə bərk / şiddətli; *The pain was past bearing Ağrı dözülməz idi*

**paste$^{1}$** [peɪst] *n* **1.** yağ və şirə qatılmış xəmir; **2.** makaron məmulatı; 3 pasta; mastika; **dental ~** diş pastası; **nail ~** dırnaq pastası; **4.** *aşp.* paştet; halva; pastila *(qəndlə meyvə horrasından hazırlanmış şirniyyat);* **5.** yapışqan *(xüs. kağız yapışdırmaq üçün un, su və s.-dən hazırlanmış);* **thin / thick ~** sıyıq / qatı yapışqan

**paste$^{2}$** [peɪst] *v* yapışdırmaq *(xüs. yapışqanla);* **to ~ with *smth.*** bir şeylə yapışdırmaq; **to ~ pieces of paper together** kağızın parçalarını bir yerə yapışdırmaq; **to ~ up an advertisement** elan yapışdırmaq

**paster** ['peɪstə$^{r}$] *n* malların üstünə yarlıq vuran / yapışdıran fəhlə

**pasteurization** [.pæstəraı'zeıʃn] *n* pasterizasiya, pasterizə etmə *(süddə, konservlərdə və s.-də mikrobların inkişafının qarşısını almaq üçün onları müəyyən dərəcəyə qədər qızdırmaqla zərərsizləşdirmə üsulu)*
**pasteurize** ['pæstəraız] *n* pasterizə etmək *(südü və s.)*
**pasteurizer** ['pæstəraızə^r] *n* pasterizator *(pasterizasiya cihazı)*
**pastille** ['pæstəl] *n* 1. qoğal, kökə; 2. yastı həb, tablet; 3. yastı şirni *(konfet)*
**pastime** ['pa:staım] *n* əyləncə; *Drawing is her favourite pastime Şəkil çəkmək onun ən sevimli əyləncəsidir*
**pasting** ['peıstıŋ] *n* ağır məğlubiyyət; *The team took a real pasting Komanda əsl mənada ağır məğlubiyyətə uğradı*
**past-master** ['pa:st.ma:stə^r] *n* misilsiz / tayı-bərabəri olmayan usta; əsl mütəxəssis; **to be ~ in** ***smth.*** bir şeydə əsl mütəxəssis / misilsiz usta olmaq
**pastry** ['peıstrı] *n top.i* 1. qənnadı məmulatları *(tort, pirojna, peçenye və s.)*; 2. *d.d.* gözəl / qəşəng / sevimli qadınlar
**pastrycook** ['peıstrıkuk] *n* qənnadçı, şirniyyatçı, şirniyyat bişirən
**pasturage** ['pa:stjurıdʒ] *n* 1. örüş, otlaq; 2. otarma, otarılma
**pasture**[1] ['pastʃə^r] *n* örüş, otlaq, yaşıl ot; **common ~** ümumi örüş / otlaq; **to put a flock out to ~** sürünü örüşə buraxmaq / çıxartmaq
**pasture**[2] ['pastʃə^r] *v* 1. mal/mal-qara otarmaq; 2. otlamaq
**pastureland** ['pastʃəlænd] *n* örüş, otlaq
**pasty**[1] ['pæstı] *n* 1. içi ətlə, meyvə və ya cemlə doldurulmuş piroq, ətli / meyvəli / cemli piroq; 2. *poliqr.* cildçi, cildçəkən
**pasty**[2] ['peıstı] *adj* 1. xəmir kimi, xəmirəoxşar, xəmirəbənzər; suvaşqan, yapışqan; 2. solğun, rəngi qaçmış / solmuş / ağarmış; **a ~ face** solğun / rəngi qaçmış sifət; 3. *d.d.* xəstə, naxoş, azarlı; *I feel pasty (Mən) özümü pis / xəstə hiss edirəm*; 4. *d.d.* saxta, süni *(qiymətli daş-qaş haq.)*
**pat**[1] [pæt] *n* 1. vurma; sığallama; *She gave the child a pat on the head O, uşağın başını tumarladı / sığalladı*; 2. zəif səs; parıltı, şapalaq; 3. addım səsi; **the ~ of light footsteps** yüngül addım səsləri; 4. Amerika zəncilərinin rəqsi; 5. yağ parçaları / dairəcikləri; *The butter is served in diminutive pats Yağ xırda dairəcik şəklində verilir*;
◊ **a ~ on the back** kürəyinə vurma *(razılıq əlaməti olaraq)*; **to give** ***smb.*** **a ~ on the back** bir kəsin kürəyinə vurmaq *(razılıq əlaməti olaraq)*
**pat**[2] [pæt] *adj* tam doğru / düzgün, münasib, uyğun; *His answer was too pat to be convincing Onun cavabı çox inandırıcı idi*
**pat**[3] [pæt] *v* (-tt-) 1. vurmaq; şappıldatmaq; **to ~** ***smb.*** **on the back** 1) bir kəsin kürəyinə vurmaq; 2) *məc.* bir kəsə razılığını bildirmək; 2. tumarlamaq, sığallamaq; **to ~ a dog / a lamb,** ***etc.*** iti / quzunu və s. tumarlamaq; *She patted her hair O, saçını sığalladı*; 3. silmək, qurulamaq; *She patted her face dry with a towel O, üzünü dəsmalla silib qurutdu*
**pat**[4] [pæt] *adv d.d.* 1. məqamında, vaxtında, yerində; 2. dəqiq, kamil, düz; **to know a lesson off ~** dərsi dəqiq / kamil bilmək
**patch**[1] [pætʃ] *n* 1. yamaq, pinə; 2. bir tikə / parça / çəngə; parça, tikə; 3. gözdə sarğı / sarıq; 4. xal, süni xal *(üzdə)*; 5. qaşqa, ləkə; **a ~ of white on a horse's nose** atın burnunda ağ qaşqa/ləkə; **a ~ of moisture** nəmlik ləkəsi; 6. torpaq sahəsi; **a cabbage / vegetable / potato ~** kələm / tərəvəz / kartof sahəsi; 7. paltarda haşiyə; *These patches are the very high of the fashion Belə haşiyələr indi çox dəbdədir*; 8. parça, hissə; **a ~ of poetry** şer parçası; *The book is good in patches Kitab bəzi hissələrdə yaxşıdır*; 9. *tib.* ləkə, nişan
**patch**[2] [pætʃ] *v* 1. yamamaq, yamaqlamaq, yamaq qoymaq / salmaq; *The elbows on his coat have worn thin, so I must patch them Onun paltosunun dirsəkləri süzülüb, gərək mən onlara yamaq salım*; **to ~ up an old trousers** köhnə şalvarı yamamaq, köhnə şalvara yamaq salmaq; 2. **(up)** sarımaq, sarıq qoymaq; *The doctor patched up the wounded soldier and sent him back to fight again Həkim yaralı əsgərin yarasına sarıq qoydu və onu yenidən vuruşa göndərdi*; 3. təmir etmək, düzəltmək; *He could patch up his bike after the accident Qəzadan sonra o, velosipedini təmir edə bildi*
**patched** [pætʃt] *adj* 1. yamanmış, yamaq qoyulmuş, yamaqlı; **~ trousers / coat / shirt,** ***etc.*** yamaqlı şalvar / palto / köynək və s.; 2. sarınmış, sarıq qoyulmuş
**patcher** ['pætʃə^r] *n* xırda təmir işləri görən fəhlə
**patchiness** ['pætʃınıs] *n* 1. ləkəlilik; xallılıq; 2. ala-bəzəklilik, əlvanlıq, rəngbərənglik; ala-seyrəklik, ala-talalıq
**patchouli** ['pætʃulı] *n* 1. *bot.* paçuli *(dodağıçiçəklilər fəsiləsindən olan tropik bitki)*; 2. paçuli bitkisindən hazırlanmış ətir
**patch-pocket** ['pætʃ.pɔkıt] *n* üstdən qoyulmuş / tikilmiş cib; **a collarless coat with two ~s** yaxalıqsız və üstdən tikilmiş iki cibli palto
**patchy** ['pætʃı] *adj* 1. ləkəli, ləkə ilə örtülü, xal-xal, xallı; 2. müxtəlif tərkibli / cinsli, yekcins olmayan; alabəzək, ala-bula, rəngbərəng, əlvan; *The land here is patchy Torpaq burada yekcins deyil*; 3. qırıq, qırıq-qırıq, arabir, orda-burda, ala-tala, ala-seyrək; **~ fog** ala-tala/ala-seyrək duman; **~ cloud** ala-tala/ala-seyrək bulud; 4. natamam, yarımçıq; *My knowledge of German is patchy Mənim alman dilindən biliyim natamamdır / qırıq-qırıqdır*
**patent**[1] ['peıtnt] *n* 1. patent; diplom; **consular ~**



konsul patenti; **to grant a ~** patent vermək; *The patent runs out Patent qurtarır*; 2. patent hüququ; **a ~ for an invention** ixtira üçün patent; 3. patent verilmiş əşya / şey
**patent**[2] ['peıtnt] *adj* 1. açıq, aydın, aşkar; şübhəsiz, göz qabağında olan; **~ fact** açıq / aşkar fakt; **~ crime** aşkar / şübhəsiz / göz qabağında olan cinayət; *This advantages of the plan are patent Bu planın üstünlüyü şübhəsizdir / aydındır*; 2. patentli; patent almış / verilmiş; **~ medicine** patentli / patent verilmiş dərman; **~ food / goods** patent almış ərzaq / mallar; 3. orijinal, yeni, şəxsi ixtira; **~ device** orijinal ixtira; 4. açıq; **a ~ verandah** açıq balkon; 5. məşhur, hamıya məlum olan; əlverişli, münasib; 6. əla növ *(un haq.)*
**patent**[3] ['peıtnt] *v* 1. patent vermək; 2. patent almaq
**patentee** [.peıtn'ti:] *n* patent sahibi, patent alan
**patenting** ['peıtntıŋ] *n* patent vermə / verilmə
**patentright** ['peıtnt'raıt] *n* patent hüququ
**paternal** [pə'tə:nl] *adj* 1. atalıq, ata; **~ authority** atalıq nüfuzu; 2. ata qohumu; **her ~ grandmother** onun ata nənəsi
**paternally** [pə'tə:nəlı] *adv* ata kimi
**paternity** [pə'tə:nıtı] *n* atalıq; *He denied paternity of the boy O, oğlana ata olmaqdan imtina etdi*
**path** [pa:θ] *n* 1. cığır; **a ~ through the woods** meşə cığırı, meşədən keçən cığır; *They used axes to clear a path through the forest Meşə cığırını təmizləmək üçün onlar baltadan istifadə etdilər; Keep the path or you'll lose your way Cığırdan çıxma/çıxmayın, yoxsa yolunu / yolunuzu itirəcəksən / itirəcəksiniz*; 2. yol; **the ~ to the town** şəhərə gedən yol; *Hard work is the path to success Müvəffəqiyyətin yolu ağır zəhmətdir*; **to go/to follow in** ***smb.'s*** **~** bir kəsin yolu ilə getmək; **to stray from the narrow ~** *məc.* yolunu azmaq, yolundan çıxmaq; **~ to victory / economic recovery** qələbənin / iqtisadi dirçəlişin yolu
**pathetic** [pə'θetık] *adj* riqqətli, təsirli, həyəcanlandırıcı, riqqət doğuran; kədərli, həzin, yanıqlı, qəmli; **in a ~ voice** yanıqlı / qəmli səslə; **~ sight** riqqət doğuran mənzərə; **~ fate** kədərli tale; **~ face / eyes** kədərli sifət / gözlər; *Their parting was pathetic Onların ayrılması çox həyəcanlandırıcı / təsirli idi*
**pathetically** [pə'θetıkəlı] *adv* riqqətlə, həssaslıqla, şəfqətlə; həzin-həzin, qəmgin-qəmgin, yanıqlı-yanıqlı
**pathfinder** ['pa:θ.faındə^r] *n* tədqiqatçı *(az öyrənilmiş ölkəni öyrənən)*; ləpirçi, iztanıyan; kəşfiyyatçı
**pathless** ['pa:θlıs] *adj* 1. cığırsız, yolsuz, yolu olmayan; keçilməz, keçilməsi mümkün olmayan; **~ forest** keçilməz / keçilməsi mümkün olmayan meşə; 2. tədqiq edilməmiş, öyrənilməmiş
**pathogen** [.pæθə'dʒən] *n* patogenez *(xəstəlik prosesinin inkişafında ardıcıllıq)*
**pathogenesis** [.pæθə'dʒenısıs] *n* = **pathogen**
**pathogenic** [.pæθə'dʒenık] *adj* xəstəlik törədən
**pathologist** [pə'θɔlədʒıst] *n tib.* patoloq *(patologiya mütəxəssisi)*
**pathology** [pə'θɔlədʒı] *n tib.* patologiya *(orqanizmdəki xəstəlik proseslərindən bəhs edən və anormal hadisələri tədqiq edən elm)*
**pathos** ['peıθɔs] *n* pafos *(coşğunluq, ruh yüksəkliyi, vəcd, həyəcan, təmtəraq)*
**pathway** ['pa:θweı] *n* cığır; yol; **a ~ to knowledge** biliyə yol / cığır
**patience** ['peıʃns] *n* 1. səbir, dözüm, hövsələ; səbirlilik, dözümlülük, hövsələlik; *I've no patience with him d.d. O məni hövsələdən çıxarır*; **to be / to get out of ~** hövsələdən çıxmaq, hövsələsini / dözümünü itirmək; **to put** ***smb.*** **out of ~** bir kəsi hövsələdən/özündən çıxartmaq; 2. inad, israr, səbat; qətiyyət
**patient**[1] ['peıʃnt] *n* xəstə; yaralı; *I've been a patient of Dr Davis for many years Mən uzun illərdir ki, doktor Deyvisin xəstəsiyəm*
**patient**[2] ['peıʃnt] *adj* 1. səbirli, hövsələli; **to be ~ with / towards** ***smth.*** bir şeyə qarşı səbirli / dözümlü olmaq; *You have to be patient with my mother - she's rather deaf Sən / Siz mənim anama qarşı səbirli olmalısan / olmalısınız - o, demək olar ki, kardır*; 2. **(of)** dözümlü, tab gətirə bilən; **plants ~ of cold** soyuğadavamlı bitkilər; 3. **(of)** təkidli, gərgin; **years of ~ labour** gərgin əmək illəri
**patiently** ['peıʃntlı] *adv* səbirlə, dözümlə; **to wait /to sit / to listen ~** səbirlə gözləmək / oturmaq / dinləmək
**patina** ['pætınə] *n* patin, paxır *(qədim mis və ya tunc şeylər üzərində əmələ gələn qəhvəyi-yaşıl pas)*
**patination** ['pætıneıʃn] *n* paxırlaşma, paxır əmələ gəlmə
**patisserie** [pə'tısərı] *n fr.* qənnadı malları, şirniyyat *(tort, pirojna və s.)*
**patois** ['pætwa:] *n fr.* yerli şivə; **to speak local ~** yerli şivədə danışmaq; *He speaks the local patois O, yerli şivədə danışır*
**patriarch** ['peıtrıa:k] *n* 1. ailə / qəbilə / icma/ tayfa başçısı; 2. patriarx *(pravoslav kilsəsinin başçısı)*; 3. ulu baba, soy başı; 4. ağıllı, təcrübəli müdrik qoca
**patriarchal** [.peıtrı'a:kl] *adj* 1. patriarxat, patriarxal *(kişilər tərəfindən idarə olunan)*; **a ~ society** patriarxal cəmiyyət; 2. hörmətli, aqil, hörmətə layiq; 3. *kils.* patriarx
**patriarchate** ['peıtrıa:keıt] *n* 1. *kils.* patriarxlıq *(patriarx idarəsi və rütbəsi)*; 2. *din.* patriarxiya *(patriarxiyaya tabe olan kilsə dairəsi)*; 3. patriarxın iqamətgahı
**patriarchy** ['peıtrıa:kı] *n* 1. patriarxat; 2. = **patriarchate** *(2-ci mənada)*; kişilər tərəfindən idarə olunan cəmiyyət

**patrician**[1] [pə'trɪʃn] *n* **1.** *tar.* patrisi, zadəgan *(qədim Romada)*; **2.** aristokrat, kübar, əsilzadə

**patrician**[2] [pə'trɪʃn] *adj* **1.** patrisi, kübar; zadəgan, əsilzadə; ~ **family** kübar / əsilzadə ailəsi; **2.** aristokrat, aristokratlara məxsus olan; **old ~ houses** aristokratlara məxsus olan köhnə evlər, köhnə aristokrat evləri

**patricide** ['pætrɪsaɪd] *n* öz atasını öldürmə; ata qatilliyi

**patrimonial** ['pætrɪmounjəl] *adj* ata-babadan qalma, irsən keçmə; ~ **estate** ata-babadan qalma mülk / malikanə

**patrimony** ['pætrɪmənɪ] *n* **1.** ata-babadan qalma miras; **2.** varislik

**patriot** ['peɪtrɪət] *n* vətənpərvər, patriot; **a true ~** həqiqi vətənpərvər

**patriotic** [ˌpætrɪ'ɔtɪk] *adj* **1.** vətənpərvərlik; **~ feelings** vətənpərvərlik hissləri; **~ songs** vətənpərvərlik mahnıları/ nəğmələri; **2.** vətənpərvər; **~ men and women** vətənpərvər kişilər və qadınlar

**patriotically** [ˌpætrɪ'ɔtɪkəlɪ] *adv* vətənpərvərcəsinə, vətənpərvər kimi; *He acted patriotically O, vətənpərvərcəsinə hərəkət etdi*

**patriotism** ['pætrɪətɪzm] *n* vətənpərvərlik, patriotizm

**patrol**[1] [pə'troul] *n* **1.** patrul, patrul / gözətçi dəstəsi, kəşfiyyatçı dəstəsi; **2.** patrul / keşik çəkmə; **army / police ~** ordu / polis patrulu

**patrol**[2] [pə'troul] *adj* patrul, keşikçi; **~ duty** *hərb.* patrul xidməti; **a ~ car** patrul / keşikçəkən maşın; **~ vessel** patrul gəmisi

**patrol**[3] [pə'troul] *v* patrul keşiyi çəkmək; *Troops regularly patrol along the border Qoşun mütəmadi olaraq sərhəd boyu patrul keşiyi çəkir*

**patron** ['peɪtrən] *n* **1.** hami, himayə edən adam, havadar, himayəçi; mesenat *(elm və incəsənətə hamilik edən varlı adam)*; **~ of the art** incəsənəti himayə edən, incəsənət hamisi; **2.** daimi müştəri *(mağazanın, restoranın və s.)*; *Patrons are requested to leave their bags in the cloakroom Müştərilərdən xahiş olunur ki, çantalarını qarderobda qoysunlar*

**patronage** ['pætrənɪdʒ] *n* **1.** himayə, himayəçilik, hamilik, havadarlıq; **to ensure** ***smb.'s*** **~** bir kəsin hamiliyini əldə etmək; **to extend** ***one's*** **~ to** ***smb.*** bir kəsə hamilik / himayəçilik etmək; **2.** *d.d.* şəxsi maliyyə köməyi

**patroness** ['peɪtrənɪs] *n* himayəçi qadın / qız

**patronize, -ise** ['pætrənaɪz] *v* **1.** himayə/himayəçilik /havadarlıq etmək; qəyyumluq/qayğıkeşlik etmək; qanadları altına almaq; *I don't want to be patronized Mən istəmirəm ki, mənə qəyyumluq etsinlər*; **2.** *d.d.* şəxsi maliyyə köməyi göstərmək *(müəssisəyə və s.)*; **3.** daimi müştəri olmaq

**patronizingly, -singly** ['pætrənaɪzɪŋlɪ] *adv* havadarlıqla, qayğıkeşliklə; qayğıkeş bir tərzdə

**patsy** ['pætsɪ] *n amer.* **1.** qorxaq, ağciyər; heç bir rolu olmayan / zəif adam; **2.** axmaq, sarsaq, maymaq, fərsiz; **to play** ***smb.*** **for a ~** bir kəsi barmağa dolamaq, bir kəsi axmaq yerinə qoymaq / aldatmaq

**patter**[1] ['pætə] *n* I **1.** şorti dil, sosial jarqon; **thieves' ~** oğruların jarqonu; **2.** iti / cəld danışma; üdüləmə, üdüləyib tökmə; yanıltmac; **3.** *d.d.* boş danışıq, cəfəngiyyat; *I could hardly stand her patter Mən onun cəfəngiyyatına güclə dözdüm*

**patter** ['pætəʳ] *n* II **1.** ahəstə tıqqıltı / səs *(yağış səsi və s.)*; tappıltı; **the ~ of the rain** yağış səsi; **2.** yüngül addım səsi, tappıltı; **the ~ of footsteps** addımların ahəstə səsi; **the ~ of hoofs** dırnaq tappıltısı *(atın və s.)*

**patter**[2] ['pætəʳ] *v* I **1.** jarqonda danışmaq; **2.** naqqallıq etmək, laqqırtı vurmaq, dil boğaza qoymamaq; üdüləyib tökmək; **to ~ prayers / charms** duanı / cadunu üdüləyib tökmək;

◊ **to ~ flash** jarqonda / gizli dildə danışmaq

**patter** ['pætəʳ] *v* II **1.** döymək, döyəcləmək *(yağış, dolu və s.)*; *The rain pattered against the panes Yağış pəncərənin şüşələrini həzin-həzin döyürdü / döyəcləyirdi*; **2.** ayaqlarını tappıldada–tappıldada yerimək; *She pattered downstairs O, ayaqlarını tappıldada-tappıldada pilləkənlərlə aşağı qaçdı;* **3.** tıqqıltılə / tappıltılə atmaq; *The wind was pattering the acorns Külək palıd qozalarını tappıltı ilə yerə salırdı*; **4.** sıçratmaq, sıçradıb islatmaq, islatmaq; *The trees pattered me all over with big drops Ağaclardan düşən iri damcılar məni başdan-ayağa qədər islatdı*

**pattern**[1] ['pætn] *n* **1.** nümunə, misal, forma, qəlib; **~s of behaviour, behaviour ~s** davranış nümunələri; **~s for pottery** dulusçuluq məmulatı üçün qəlib / forma; **made to ~** nümunə / qəlib üzrə hazırlanmış; *She is a pattern of all the virtues O bütünlükdə səxavət nümunəsidir*; **2.** quruluş, forma; **the ~ of the sentence** cümlə quruluşu; *These sentences all have the same grammatical pattern Bütün bu cümlələrin həmısı eyni qrammatik quruluşa malikdir*; **3.** naxış; **the ~ of the carpet** xalçanın naxışı; **the ~s made by the frost on the window-panes** şaxtanın pəncərə şüşələrində açdığı / əmələ gətirdiyi naxışlar

**pattern**[2] ['pætn] *v* **1.** nümunəyə əsasən / nümunə üzrə hazırlamaq; üzünü çıxartmaq; **2.** naxışla bəzəmək

**patterned** ['pætnd] *adj* naxışlı, naxışlanmış; **~ china / wallpaper** naxışlı çini qab / divar kağızı

**paucity** ['pɔ:sɪtɪ] *n* **1.** az miqdar; **2.** çatışmazlıq; azlıq; çatmama; kifayət etməmə; **~ of evidence** sübutun azlığı / kifayət etməməsi

**paunch** [pɔntʃ] *n d.d.* **1.** qarın, yekə qarın *(xüs. kişilərdə)*; **a young man with a ~** yekəqarın cavan oğlan; **2.** *anat.* işkombə, birinci mədə *(kövşəyən heyvanlarda)*



**paunchy** ['pɔntʃɪ] *adj* yekəqarın, qarınlı; **a ~ man** yekəqarın / yekəqarınlı kişi

**pauper** ['pɔ:pəʳ] *n* **1.** kasıb, dilənçi; **"Prince and Pauper"** *(Mark Twain)* "Şahzadə və Dilənçi"; *He died a pauper O, dilənçi kimi öldü*; **2.** kasıblığa görə verilən təqaüdlə yaşayan adam

**pauper-asylum** ['pɔ:pərəˌsaɪləm] *n arx.* dilənçilər üçün sığınacaq/daldalanacaq yeri

**pauperize** ['pɔ:pəraɪz] *v* dilənçiləşdirmək, dilənçi kökünə / vəziyyətinə salmaq

**pause**[1] [pɔ:z] *n* **1.** pauza, fasilə, tənəffüs; **to make a ~** pauza / fasilə etmək; *There was a long pause before she answered O, cavab verməzdən öncə / əvvəl uzun bir pauza / fasilə oldu; After a short pause, they continued working Qısa fasilədən / tənəffüsdən sonra onlar işi davam etdirdilər*; **without ~** fasiləsiz; *The rain fell without pause Yağış fasiləsiz yağdı*; **2.** *mus.* fermato *(not yazılışında: çalarkən, ya oxuyarkən səsi bir qədər uzatmaq və ya ara vermək lazım gəldiyini göstərən işarə)*

**pause**[2] [pɔ:z] *v* **1.** pauza / fasilə / tənəffüs etmək; dayanmaq, nəfəsini dərmək; *We paused upon the summit Yüksəklikdə biz nəfəsimizi dərdik; He paused at the door O, qapının ağzında dayandı*; **2. (on, upon)** dayanmaq, pauza etmək; *He paused upon this word O, bu sözdə pauza etdi / dayandı*; **3.** ləngimək, ləngitmək, tərəddüd etmək, duruxmaq

**pave** [peɪv] *v* **1.** döşəmək *(yolu: daşla, çınqılla və s.)*; **2.** salmaq, sərmək, örtmək; **3.** yol açmaq / salmaq; **to ~ the way for fame** şöhrətə yol açmaq; **to ~ the way to their future work** onların gələcək işləri üçün yol açmaq

**paved** [peɪvd] *adj* döşənmiş, daş döşənmiş; **~ road / street** daş döşənmiş yol / küçə

**pavement** ['peɪvmənt] *n* **1.** səki, küçə səkisi; **2.** mozaika və s. ilə döşənmiş döşəmə; **3.** *amer.* döşəmə, döşənmiş yol;

◊ **on the ~** evsiz, yersiz, yurdsuz, küçədə; **to hit the ~** 1) işdən qovulmaq; 2) bayıra atılmaq *(restorandan və s.)*; **to push the ~** malı küçədə satmaq

**pavement-artist** ['peɪvməntˌa:tɪst] *n* səkidə şəkil çəkən rəssam *(pul qazanmaq üçün)*

**pavement-pusher** ['peɪvməntˌpuʃəʳ] *n d.d.* küçə alverçisi, küçədə alver edən adam

**paver** ['peɪvəʳ] *n* **1.** döşəməçi *(yola, küçəyə daş, asfalt döşəyən fəhlə)*; **2.** *yola döşəmək üçün daş, kərpic və s.*

**pavilion** [pə'vɪljən] *n* **1.** pavilyon *(bağ və parklarda yüngül tikili: çiçək və s. satmaq üçün)*; **2.** çadır, alaçıq, xeymə; **3.** *anat.* qulaq seyvanı

**paw**[1] [pɔ:] *n* **1.** pəncə, ayaq *(heyvanlarda)*; **bear's / tiger's ~** ayının / pələngin pəncəsi; **2.** *d.d.* əl; *Go and wash your dirty paws! Get / Gedin çirkli əllərini / əllərinizi yu/yuyun! Take your dirty paws off me! O murdar əllərini / əllərinizi məndən çək / çəkin!*

◊ **to make a cat's ~ of** ***smb.*** bir kəsi qula/əlaltıya çevirmək

**paw**[2] [pɔ:] *v* **1.** pəncəsi ilə toxunmaq / vurmaq /cırmaqlamaq; *The cat pawed at the door Pişik qapını cırmaqladı*; **2.** dırnağı ilə döymək *(at)*; *The mare was snorting and pawing (at) the ground Madyan fınxırır və dırnağını yerə döyürdü*; **3.** *d.d.* əlilə tutmaq, əlləmək, sıxçalamaq; *Somebody was pawing about the door for the handle Kimsə dəstəyi tapmaq üçün qapını əlləyirdi; Don't paw at me! Mənə toxunma / toxunmayın!*

**pawn**[1] [pɔ:n] *n* I **1.** *şahm.* piyada; **passed ~** keçə bilən piyada; **single ~** təcrid olunmuş piyada; **2.** iradəsiz / vecsiz / ağzıboş adam, müqəvva

**pawn** [pɔ:n] *n* II **1.** girov; **at / in ~** girov qoyulmuş; **to give in ~** girov qoymaq; *My ring is in pawn Mənim üzüyüm girov qoyulub*; **2.** girov/zamin saxlanılan adam; *They are being used as political pawns in the struggle for power Onlardan hakimiyyət uğrunda mübarizədə siyasi girov kimi istifadə edirlər*; **3.** öhdəlik, öhdəçilik, zəmanət, zaminlik; **the ~ to give the country freedom** ölkəyə azadlıq vermə zəmanəti

**pawn**[2] [pɔ:n] *v* **1.** girov qoymaq, girov olaraq vermək; *He pawned his gold watch to give the rent Ev kirayəsini ödəmək üçün o, qızıl saatını girov qoydu*; **2.** zamin olmaq / durmaq; **to ~** ***one's*** **life / one's honour** həyatını / şərəfini zamin qoymaq; *I'll pawn my life for her Mən onun üçün həyatımla zamin duraram*; **3.** *d.d.* haqq-hesabı başqasına ödətmək üçün qaçıb aradan çıxmaq

**pawnable** ['pɔ:nəbl] *adj* girov qoyula bilən

**pawnbroker** ['pɔ:nˌbroukəʳ] *n* sələmçi, müamiləçi; **at the ~'s** lombardda qoyulmuş

**pawnshop** ['pɔ:nʃɔp] *n* lombard

**pay**[1] [peɪ] *n* **1.** ödəmə, vermə, ödənmə; ödəniş; **rate of ~** ödəmə/ödəniş norması; **overdue ~** vaxtı keçmiş ödəniş; **2.** maaş, məvacib, aylıq, donluq, əmək haqqı; **base ~** əsas əmək haqqı; *What's the pay? Maaş / Əmək haqqı nə qədərdir?*;

◊ *No pay, no play* ≅ *Pulsuz halva yemək olmaz*

**pay**[2] [peɪ] *v (pt, pp* **paid** [peɪd]) **1.** ödəmək, vermək, haqqını vermək / ödəmək; pul vermək; *I paid the money yesterday Mən pulu dünən ödədim/verdim; He must pay at once O dərhal ödəməlidir; How much did she pay on my behalf? O mənim əvəzimə nə qədər ödədi / pul verdi?*; **to ~ ready money (down)** nağd pulla ödəmək; **to ~ in advance** əvvəlcədən ödəmək; **to ~ for** ***smth.*** bir şeyin haqqını ödəmək; *What does she pay for her apartment? O, evi üçün nə qədər pul verir?*; **to ~ for service** xidmət üçün haqq ödəmək; **to ~** ***one's*** **debt** borcunu ödəmək; **to ~ duty** gömrük vergisi ödəmək / vermək; **to ~ wages** əmək haq-

qı / maaş vermək; *We are paid on Fridays Bizim maaşımızı cümə günü verirlər; I paid him ten dollars to translate the article Mən ona məqaləni tərcümə etmək üçün on dollar verdim*; 2. əvəzi çıxmaq; xeyirli / mənfəətli olmaq; *This work does not pay Bu, mənfəətsiz / xeyirsiz işdir; It pays to advertise Reklamın həmişə əvəzi çıxır*; 3. cəfasını / əziyyətini / zərərini çəkmək; *He shall pay for this O bunun əziyyətini çəkəcək; He paid for his foolishness with his life Axmaqlığı ona həyatı bahasına başa gəldi*; 4. *d.d. dial.* cəza vermək, döymək; *The rascal pays his wife Bu yaramaz arvadını döyür*; **to ~ back** 1) pulu qaytarmaq; *Advance is to be paid back within a year Avans bir il müddətində geri qaytarılmalıdır*; 2) əvəzini çıxmaq / çıxartmaq, əvəzini vermək; *He paid the man back in full O, kişidən əvəzini yaxşıca çıxdı*; **to ~ down** 1) nağd pulla ödəmək; 2) ilk ödəməni / pulu vermək *(bir şeyi möhlətlə alanda)*; *They had to pay down one fourth of the price in ready cash Onlar qiymətin dörddə birini nağd pulla ödəməli oldular*; **to ~ for** 1) ödəmək, haqqını vermək; *It has been paid for Onun haqqı ödənilib*; 2) ödəmək; çıxmaq *(qoyulan xərc haq.)*; *The garden will soon pay for itself Bağ tezliklə xərcini çıxardacaq*; 3) zərərini / əziyyətini / ağrısını çəkmək; **to ~ in** 1) bankda cari hesaba pul köçürmək; 2) mütəmadi üzvlük haqqı vermək; **to ~ in to a fund** fonda üzvlük haqqı vermək; **to ~ off** 1) borcu/haqq-hesabı tam ödəmək; **to ~ off *one's* creditors** kreditorların/kredit verənlərin borcunu ödəmək; 2) əvəzini çıxmaq, heyf / intiqam / qisas almaq; **to ~ off some grudge** haqsızlığın heyfini almaq / əvəzini çıxmaq; 3) fəhləni işdən çıxartmaq; **to ~ on** *d.d.* nağd pulla ödəmək / vermək; **to ~ out** 1) ödəmək, vermək; **to ~ out wages** maaş / əmək haqqı/ donluq vermək; 2) əvəzini vermək / çıxmaq; *I'll pay you out for that Mən bunun əvəzini səndən / sizdən çıxacam*;

◊ **to ~ attention / heed to *smth.*** bir şeyə diqqət yetirmək / vermək / məhəl qoymaq, qulaq asmaq; *Pay attention to what I tell you! Mənim sənə / sizə dediyimə qulaq as / asın!; They paid no heed whatever to my words Onlar mənim sözlərimə əsla məhəl qoymadılar*; **to ~ a call on *smb.*, to ~ *smb.* a visit** bir kəsə baş çəkmək, bir kəsin görüşünə getmək; **to ~ the debt of nature** təbiətin borcunu vermək, ölmək

**payable** [ˈpeɪəbl] *adj* 1. ödənilə bilən, ödənilməli; *This bill is payable next Monday Bu hesab gələn bazar ertəsinə qədər ödənilə bilər*; 2. gəlirli, mənfəətli; **on a ~ basis** mənfəətli əsasda

**pay-as-you-earn** [ˈpeɪəzjuˈə:n] *n* = **pay-as-you-go**

**pay-as-you-go** [ˈpeɪəzjuˈgou] *n d.d.* əmək haqqından / maaşdan çıxılan pul hesabına yığılan vergi

**pay-bed** [ˈpeɪbed] *n* xəstəxanada pullu çarpayı; *Additional pay-beds should be provided in the hospitals Xəstəxanaları əlavə pullu çarpayılarla təchiz etmək lazımdır*

**pay-day** [ˈpeɪdeɪ] *n* maaş verilən gün

**pay-hospital** [ˈpeɪˌhɔspɪtl] *n* pullu xəstəxana

**paying¹** [ˈpeɪɪŋ] *n* ödəniş, ödəmə, vermə *(muzdu, haqqı)*; **place of ~** ödəniş yeri; **term of ~** ödəniş / ödəmə müddəti

**paying²** [ˈpeɪɪŋ] *adj* əlverişli, gəlirli, qazanclı, sərfəli; *It was a very paying business Bu çox sərfəli / gəlirli iş idi*; **~ well** gəlirli/məhsuldar neft quyusu

**paying capacity** [ˈpeɪɪŋkəˈpæsɪtɪ] *n* ödəmə qabiliyyəti

**payload** [ˈpeɪloud] *n* 1. faydalı qüvvə; **final ~** raketin son başlığında yerləşdirilən partlayıcı maddələrin miqdarı; 2. faydalı yük

**paymaster** [ˈpeɪˌma:stəʳ] *n* pul verən, kassir

**payment** [ˈpeɪmənt] *n* 1. ödəmə, ödənmə, haqq, ödəniş; muzd; vermə; haqqını vermə /ödəmə; **monthly ~** aylıq ödəniş; **~ in / by cash** nağd pulla ödəmə / ödəniş; **promise of ~** ödəmə / ödənmə təəhhüdü / öhdəliyi; **to defer ~** ödənişi təxirə salmaq / ləngitmək; **to effect / to make ~** muzdu/haqqı ödəmək; haqqını / muzdunu vermək; **~ by the hour** saathesabı ödəniş; **to enforce ~** haqqı / muzdu ödəməyə məcbur etmək; **to stop ~** ödənişi/ ödəməni dayandırmaq; 2. mükafat, mükafatlandırma; əvəz vermə; **~ for services** xidmət üçün mükafatlandırma / mükafat vermə; 3. verilməli olan pulun məbləği; 4. cəza; qisas alma, hesablaşma

**pay-off** [ˈpeɪˈɔf] *n amer. d.d.* 1. vermə, ödəmə, ödənmə; 2. ödəmə vaxtı; 3. mükafat, bəxşiş; 4. hesab çəkmə, qisas / intiqam alma

**payout** [ˈpeɪaut] *n* ödəmə, ödəniş; hissə-hissə ödəmə

**pay-phone** [ˈpeɪfoun] *n amer.* avtomat telefon

**pay rise** [ˈpeɪraɪz] *n* maaşların / əmək haqqlarının artırılması

**payroll** [ˈpeɪroul] *n* 1. *bir müəssisədə və ya kompaniyada işləyən adamların siyahısı və onların hər birinə verilən pulun məbləği*; 2. *kompaniyanın işçilərinə verilən maaş və əmək haqqlarının ümumi məbləği*

**pea** [pi:] *n bot.* noxud; **split ~s** qabıqdan çıxarılmış noxud; **to shell ~s** noxudu qadıqdan çıxartmaq; **green ~s** göy noxud;

◊ **as like as two ~s** ≅ ikiyə bölünmüş bir alma kimi oxşar

**peace¹** [pi:s] *n* 1. sülh; **just ~** ədalətli sülh; **universal ~** ümumi sülh; **stable ~** möhkəm sülh; **lasting ~** uzunmüddətli sülh; **world ~** dünyada sülh; **to be at ~** 1) müharibə etməmək, sülh şəraitində olmaq; *At last the country was at peace again Nəhayət, ölkə yenidən sülh şəraitində idi*; 2) sakitləşmək; *He is at peace O, sakitləşib*; **~ at any price** nəyin bahasına olur-olsun sülh; **to make ~** 1) sülh bağlamaq, sülhə gəlmək; 2) barışmaq, razılaşmaq; **to make *one's* ~ with *smb.*** bir kəslə barışmaq; 2. *(həm də* **the Peace***)* sülh müqaviləsi; *(A) peace was signed between the two countries İki ölkə arasında sülh müqaviləsi imzalandı*; 3. sakitlik, rahatlıq; dinclik, asudəlik; asayiş; **~ in the home** evdə sakitlik; **~ of the evening** axşamın sakitliyi; **in ~** sakitcə, rahatca; *He may sleep in peace O rahatca yata bilər*; **to leave *smb.* in ~** bir kəsi sakit buraxmaq; **to give *smb.* no ~** bir kəsə rahatlıq verməmək



**peace²** [pi:s] *adj* sülh; **~ movement** sülh hərəkatı; **~ conference** sülh konfransı; **~ treaty** sülh müqaviləsi; **~ talks** sülh danışıqları

**peaceable** [ˈpi:səbl] *adj* 1. sülhsevər, sülhpərvər; **a ~ person** sülhsevər adam; 2. dinc, sakit; **a ~ discussion** sakit müzakirə

**peaceably** [ˈpi:səblɪ] *adv* sakit, dinc; **to live ~ with *one's* neighbours** qonşuları ilə dinc / sakit yaşamaq

**peace-breaker** [ˈpi:sˌbreɪkəʳ] *n* 1. sülhü pozan; 2. *hüq.* ictimai qayda-qanunu / asayişi pozan şəxs

**peaceful** [ˈpi:sfl] *adj* 1. dinc, sakit; **a ~ demonstration** dinc nümayiş; **a ~ evening** sakit axşam; *It's so peaceful here in the country Burada kənddə elə sakitlikdir*; 2. sülhsevər, sülhpərvər; **~ nations** sülhsevər xalqlar

**peacefully** [ˈpi:sfəlɪ] *adv* sakit, dinc, sakitcə, dinc / sakit bir tərzdə; **to sleep ~** sakit / sakitcə yatmaq; *The child was sleeping peacefully Uşaq sakitcə yatırdı*

**peacefulness** [ˈpi:sflnɪs] *n* 1. sakitlik, dinclik; 2. sülhsevərlik, sülhpərvərlik

**peace-lover** [ˈpi:sˌlʌvəʳ] *n* sülh tərəfdarı, sülh sevən *(adam)*

**peace-loving** [ˈpi:sˌlʌvɪŋ] *adj* sülhsevər, sülhpərvər; **~ nations** sülhsevər xalqlar

**peacemaker** [ˈpi:smeɪkəʳ] *n* barışdırıcı, sülh yaradan / keşikçisi

**peace-monger** [ˈpi:sˌmʌŋgəʳ] *n istehz.* sülh tərəfdarı

**peace-time** [ˈpi:staɪm] *n* sülh zamanı / dövrü

**peach¹** [pi:tʃ] *n* 1. *bot.* şaftalı ağacı; şaftalı *(meyvə)*; 2. şaftalı rəngi; 3. *d.d.* gözəl / qəşəng qız, nazənin; *The girl was a peach Qız çox gözəl / qəşəng idi*; 4. *amer. d.d.* əla, birinci növ; **a ~ of a car** əla bir maşın

**peach²** [pi:tʃ] *v* **(against, upon, on)** şeytanlamaq, çuğulluq / şeytanlıq etmək *(xüs. məktəbli oğlanlar arasında)*; *I'm not going to peach Mən çuğulluq etmək fikrində deyiləm*; **to ~ against / upon *smb.*** bir kəs haqqında çuğulluq etmək

**peach-blossom** [ˈpi:tʃˌblɔsəm] *n* şaftalı ağacının çiçəyi / gülü

**peach-colour** [ˈpi:tʃˌkʌləʳ] *n* şaftalı rəngi

**peach-tree** [ˈpi:tʃtri:] *n* şaftalı ağacı

**peachy** [ˈpi:tʃɪ] *adj* 1. şaftalıya oxşar / bənzər *(yanaq haq.)*; 2. *d.d.* çox gözəl / yaxşı / qəşəng; *It was a peachy time for me O mənim üçün çox yaxşı bir vaxt idi*

**peacock¹** [ˈpi:kɔk] *n zool.* tovuz; *The girl looked as elegant as a peacock Qız tovuz kimi gözəl görünürdü*;

◊ **proud as a ~** tovuz quşu kimi məğrur; ≅ ərkək hinduşka kimi təkəbbürlü; **to play the ~** iddia satmaq, lovğalanmaq, təkəbbürlənmək

**peacock²** [ˈpi:kɔk] *v* 1. lovğalanmaq, təkəbbürlənmək, özünü öymək, iddia satmaq; 2. lovğa-lovğa o yan bu yana gəzmək

**peacock blue** [ˈpi:kɔkˈblu:] *n* bərqvuran göy rəng

**peahen** [ˈpi:hen] *n* dişi tovuz

**peak¹** [pi:k] *n* 1. *coğ.* pik, zirvə *(dağda)*; *The (mountain) peaks are covered with snow all the year Dağ zirvələri bütün ili qarla örtülü olur*; 2. *məc.* zirvə; **the ~ of glory** şöhrətin zirvəsi; 3. günlük *(şapkada)*, şapkanın qabaqlığı; 4. hər bir şeyin iti başı / ucu; **the ~ of a roof** damın ucu / kəlləsi

**peak²** [pi:k] *v* zirvəyə çatmaq / yüksəlmək; yüksək həddə çatmaq; *The sales peak just before Christmas Milad bayramı qabağı satış yüksək həddə çatır*

**peaked** [pi:kt] *adj* sivri, şiştəpəli, şiş; **a ~ cap** şiş papaq; **a ~ roof** şiştəpəli dam; **~ nose** şiş burun

**peal¹** [pi:l] *n* 1. gurultu *(ildırımın və s.)*; **a ~ of thunder** ildırımın gurultusu; **to break into ~s of laughter** qəhqəhə çəkib gülmək; 2. *bir və ya bir neçə zəngin səsi; A peal of bells rang out Zənglər gurultu ilə çalındı*

**peal²** [pi:l] *v* 1. gurlamaq; *A loud clap of thunder pealed overhead Başımızın üstündə qulaqbatırıcı ildırım gurladı*; 2. bütün zəngləri çalmaq; 3. qəhqəhə çəkmək, qəhqəhə ilə gülmək; *Jane pealed with laughter Ceyn qəhqəhə çəkdi / qəhqəhə ilə güldü*

**peanut¹** [ˈpi:nʌt] *n* 1. *bot.* araxis, yerfındığı; 2. yerfındığı, araxis *(meyvə)*; **a pocket of salted ~s** bir cib duzlanmış yerfındığı

**peanut²** [ˈpi:nʌt] *adj* araxis, yerfındığı; **~ oil** araxis / yerfındığı yağı

**pear** [pεəʳ] *n bot.* 1. armud ağacı; 2. armud *(meyvə)*

**pearl¹** [ˈpə:l] *n* 1. mirvari, inci, dürr; **Venetian ~** süni mirvari; **a string of ~s** bir sap mirvari; 2. mirvari / inci dənəsi; 3. sədəf; 4. şeh damlası; **~s of dew on the grass** otun üstündə şeh damlaları / damcıları

**pearl²** [ˈpə:l] *adj* mirvari, sədəf; **a ~ necklace** mirvari boyunbağı; **~ teeth** sədəf dişlər

**pearl³** [ˈpə:l] *v* 1. mirvari ilə / sədəflə bəzəmək; 2. dürr / inci axtarmaq *(suda)*; 3. şirələmək *(konfeti, pirojnanı)*; 4. qabıqdan çıxartmaq *(arpanı, çəltiyi və s.)*

**pearl-barley** [ˈpə:lˈba:lɪ] *n* 1. arpa yarması; 2. pivə bişirmək üçün arpa

**pearl-button** [ˈpə:lˈbʌtn] *n* sədəf düymə

**pearl-diver** [ˈpə:lˌdaɪvəʳ] *n* inci/dürr axtaran dalğıc

**pearled** [ˈpə:ld] *adj* 1. mirvari / inci düzülmüş; 2. şeh damcıları ilə örtülmüş; 3. qabığı alınmış *(arpa, çəltik və s.)*

**pearler** ['pɜ:lə^r] *n* **1.** = **pearl-fisher; 2.** inci / dürr yığmaq üçün balaca gəmi
**pearl-fisher** ['pɜ:l.fɪʃə^r] *n* inci / dürr yığan/ toplayan
**pearl-fishery** ['pɜ:l.fɪʃərɪ] *n* mirvari / inci yığma
**pearl-hen** ['pɜ:lhen] *n zool.* firəngtoyuğu
**pearly** ['pɜ:lɪ] *adj* **1.** sədəf; sədəf / mirvari kimi; ~ **teeth** sədəf dişlər; **teeth of** ~ **whiteness** sədəf ağlığında dişlər; **2.** sədəflə / mirvari ilə bəzənmiş; **3.** sədəf / mirvari rəngli; **4.** dürrlə/inci ilə bol olan; ~ **seas** inci / dürr bol olan dənizlər; **5.** qiymətli; büllur kimi təmiz; *She is pearly throughout O büsbütün büllur kimi təmizdir*
**pear-shaped** ['peəʃeɪpt] *adj* armudu, armudvarı, armudaoxşar, armudşəkilli, armudabənzər
**pear-tree** ['peətri:] *n* armud ağacı
**peasant**[1] ['pezənt] *n* kəndli; avam / kobud / cahil adam
**peasant**[2] ['pezənt] *adj* kənd; kəndli; ~ **woman** kəndli qadın; ~ **farmers** kənd fermerləri; ~ **labour** kəndli əməyi
**peasantry** ['pezntrɪ] *n* kəndlilər; **the local** ~ yerli kəndlilər
**pease** [pi:z] *n* noxud
**peashaped** ['pi:ʃeɪpt] *adj* noxudabənzər, noxudvarı, noxudşəkilli, noxud kimi
**pea-soup** ['pi:'su:p] *n* **1.** noxud supu / şorbası; **2.** *d.d.* sarı qatı duman
**peat** [pi:t] *n* torf
**peaty** ['pi:tɪ] *adj* torflu, torf olan; ~ **soil** torflu torpaq
**pebble**[1] ['pebl] *n* **1.** çaydaşı, çaylaq daşı, qənbər; **2.** çini növü; **3.** dağ büllurundan hazırlanmış linza
**pebble**[2] ['pebl] *v* **1.** çaydaşı ilə / qənbərlə döşəmək; **2.** daşa basmaq, daşqalaq etmək; **3.** şaqrenləşdirmək *(dərini yumşaltmaq)*
**pebble-leather** ['pebl'leðə^r] *n* şaqrenləşdirilmiş *(yumşaldılmış)* dəri
**pebbly** ['peblɪ] *adj* **1.** çaydaşı / çaylaq daşı ilə örtülü, qənbərli; **a** ~ **beach** qənbərli / daşlı çimərlik; **2.** şaqrenləşdirilmiş *(dəri haq.)*
**peccadillo** [.pekə'dɪləu] *n (pl* **-oes, -os** [-ouz]) kiçik günah/təqsir /qüsur; qəbahət, eyib
**peccary** ['pekərɪ] *n amer.* vəhşi donuz
**peck**[1] [pek] *n* **1.** dimdik, dimdik vurma, dimdikləmə; **2.** yüngül / ötəri öpüş; maç; **to give** ***smb.*** **a** ~ bir kəsi yüngülcə öpmək /maç etmək; **3.** dimdik yeri, deşik *(dimdiklə açılmış)*; **a bird** ~ quşun açdığı deşik *(meyvədə)*
**peck**[2] [pek] *v* **1.** dimdikləmək, dimdik vurmaq, dimdiklə deşmək / dəlmək / oymaq; *Birds pecked at the grapes Quşlar üzümü dimdiklədilər; The birds had pecked a hole in the sack Quşlar kisədə / torbada dimdikləri ilə deşik açmışdılar;* **2.** cəld və yüngülcə öpmək / maç eləmək; **to** ~ ***smb.*** **on the cheek** bir kəsi yanağından yüngülcə öpmək; **3.** könülsüz /iştahasız yemək; *The child is only pecking at his food; what's wrong? Uşaq çox könülsüz yeyir; nə olub?*; **4.** dimdikləyib yemək, dənləmək; *The hens are pecking at the corn Toyuqlar taxılı dənləyirlər;* **to** ~ **out** dimdikləyib çıxartmaq; *The crows had pecked out the dead goat's eyes Qarğalar ölmüş keçinin gözlərini dimdikləyib çıxartmışdılar;* **5.** kərki ilə / itiuclu alətlə qazımaq
**pecked** [pekt] *adj* dimdiklənmiş, dimdiklə deşilmiş / ovulmuş / dəlinmiş; ~ **apples** dimdiklənmiş/dimdiklə deşilmiş almalar; ~ **line** punktir *(qırıq xətlər şəklində cızıq)*
**pecker** ['pekə^r] *n* **1.** dimdik vuran quş; **2.** kərki *(alət)*; **3.** *d.d.* dimdik; burun; **4.** cəsarət, igidlik, qoçaqlıq; *Keep your pecker up! Burnunu/Burnunuzu sallama!/ sallamayın!*
**peckish** ['pekɪʃ] *adj d.d.* ac; **to be** ~ ac olmaq; **to feel a bit** ~ bir az aclıq hiss etmək
**peculiar** [pɪ'kju:lɪə^r] *adj* **1.** spesifik, xüsusi, səciyyəvi, nəzərəçarpan; özünəməxsus; **a** ~ **taste** spesifik / özünəməxsus dad; **a** ~ **smell** spesifik / xüsusi nəzərəçarpan iy; **a** ~ **noise** səciyyəvi / spesifik səs; **2.** şəxsi, fərdi; xüsusi; **my own** ~ **property** mənim özümün şəxsi/fərdi əmlakım; **3.** qəribə, qeyri-adi; **a** ~ **girl** qəribə / qeyri-adi qız; **to be a little** ~ **in** ***one's*** **dress** bir az qeyri-adi geyinmək .
**peculiarity** [pɪ.kju:lɪ'ærɪtɪ] *n* **1.** spesifiklik, xüsusiyyət, ancaq özünə məxsus olma; **a genetic** ~ genetik xüsusiyyət; **peculiarities of dress /behaviour** geyimin /davranışın xüsusiyyətləri; **2.** fərqləndirici xüsusiyyət / keyfiyyət; **a** ~ **of this disease** bu xəstəliyin fərqləndirici xüsusiyyəti; **3.** qeyri-adilik; **the** ~ **of her fate** onun taleyinin qeyri-adiliyi
**peculiarly** [pɪ'kju:ljəlɪ] *adv* **1.** xüsusilə, xüsusən, ələlxüsus; *This question is peculiarly difficult Bu məsələ xüsusən çətindir;* **2.** şəxsən, fərdi olaraq; *This idea doesn't belong peculiarly to him Bu fikir şəxsən ona aid deyil;* **3.** qəribə, təəccüblü bir surətdə, qeyri-adi; **to dress** ~ qəribə / qeyri-adi geyinmək
**pecuniary** [pɪ'kju:njərɪ] *adj* maliyyə; pul; ~ **affairs** maliyyə məsələləri; ~ **aid** pul köməyi; ~ **difficulties** maliyyə / pul çətinlikləri; ~ **claim / demand** maliyyə / pul tələbi; ~ **loss** maliyyə itkisi; ~ **penalty** pul cəriməsi
**pedagogic** [.pedə'gɔdʒɪk] *adj* pedaqoji; ~ **theory** pedaqoji nəzəriyyə; ~ **skills** pedaqoji bacarıqlar
**pedagogical** [.pedə'gɔdʒɪkəl] *adj* = **pedagogic**
**pedagogically** [.pedə'gɔdʒɪkəlɪ] *adv* pedaqoji tələblərə uyğun olaraq, pedaqoji baxımdan
**pedagogics** [.pedə'gɔdʒɪks] *adj* pedaqogika
**pedagogue** ['pedəgɔg] *n* pedaqoq, müəllim
**pedagogy** ['pedəgɔdʒɪ] *n* = **pedagogics**
**pedal**[1] ['pedl] *n* **1.** *tex.* pedal *(maşınlarda mexanizmi hərəkətə gətirmək üçün ayaq lingi)*; **2.** *mus.* pedal *(musiqi alətlərində ayaq lingi)*
**pedal**[2] ['pedl] *v* **1.** pedalı basmaq; **to** ~ **the machine** maşının pedalını basmaq; **2.** velosiped sürmək



**pedalist** ['pedlɪst] *n amer.* velosipedçi, velosiped sürən
**pedant** ['pednt] *n* pedant, xırdaçı, vasvası
**pedantic** [pɪ'dæntɪk] *adj* pedant, xırdaçı, vasvası; **a** ~ **person** pedant / xırdaçı / vasvası adam
**pedantism** ['pedəntɪzm] *n* pedantlıq, xırdaçılıq, vasvasılıq
**pedantry** ['pedntrɪ] *n* pedantlıq, xırdaçılıq, vasvasılıq; **an unnecessary display of** ~ lazımsız pedantlıq / xırdaçılıq nümayiş etdirmə
**peddle** ['pedl] *v* **1.** gəzərək / gəzdirilərək satmaq; **2.** xırdavat satmaq; **3.** satışa mal gətirmək; **to** ~ **wares from town to town** malla şəhərbəşəhər gəzmək *(satmaq üçün)*; **4.** boş / mənasız işlərlə məşğul olmaq; **to** ~ **with literature** ədəbiyyatla səthi/ ötəri / başdansovma məşğul olmaq; **to** ~ **away** ***one's*** **time** vaxtını mənasız / boş yerə sərf etmək; **to** ~ **scandals** şayiə yaymaq, dedi-qodu ilə məşğul olmaq;
◊ **to** ~ ***one's*** **papers** *amer.* 1) özgənin işinə qarışmamaq; *I told him to go and peddle his papers Mən ona dedim ki, mənim işimə qarışmasın, gedib öz işi ilə məşğul olsun;* 2) qaçmaq, əkilmək, daban almaq, götürülmək
**peddler** ['pedlə^r] *n* **1.** gizli yolla narkotik maddə satan; **2.** *amer.* = **pedlar**
**peddling**[1] ['pedlɪŋ] *n* **1.** səyyar/xırda ticarət; **2.** xırdaçılıqla/xırda şeylərlə məşğul olma
**peddling**[2] ['pedlɪŋ] *adj* **1.** səyyar alverçi, gəzərək alver edən; **2.** xırda, lazımsız, əhəmiyyətsiz; ~ **details** lazımsız təfərrüat
**pederasty** ['pedərəstɪ] *n* = **paederasty**
**pedestal**[1] ['pedɪstl] *n* pedestal *(heykəlin oturacağı)*; əsas, özül
**pedestal**[2] ['pedɪstl] *v* **1.** pedestalın üstünə qoymaq; **2.** tərifləmək, tərifini göylərə qaldırmaq
**pedestrian**[1] [pɪ'destrɪən] *n* piyada, piyada gedən *(adam)*
**pedestrian**[2] [pɪ'destrɪən] *adj* **1.** piyada, piyada gedən; **a** ~ **walkway** piyada yolu, piyadalar üçün yol; ~ **tour** piyada gəzinti; ~ **underpass** yeraltı keçid *(piyadalar üçün)*; **2.** maraqsız, cansıxıcı; **verse of** ~ **order** maraqsız şer
**pedestrianism** [pɪ'destrɪənɪzm] *n* **1.** yerimə, yeriş; **2.** idman yerişi; **3.** maraqsızlıq, quruluq, bayağılıq; ~ **of style** üslubun quruluğu / bayağılığı
**pedicure**[1] ['pedɪkjuə^r] *n* pedikür *(ayaq dırnaqlarına qulluq etmə və ayaqdakı qabarları kəsmə)*
**pedicure**[2] ['pedɪkjuə^r] *v* pedikür etmək
**pedicurist** ['pedɪkjurɪst] *n* pedikürçü, pedikür edən *(adam)*
**pedigree**[1] ['pedɪgri:] *n* **1.** şəcərə, nəsil şəcərəsi, nəsil tarixi, genealogiya *(nəsil tarixini öyrənən yardımçı elm)*; **2.** əmələ gəlmə, törəmə; mənşə, əsil-nəsil; **people without** ~ əsli-nəcabəti olmayan adamlar; *She comes from a family of pedigree O, əsli-nəsli olan ailədəndir;* **3.** sözün əmələ gəlməsi / mənşəyi; *Both words have the same pedigree Sözlərin hər ikisi eyni mənşədəndir / mənşəlidir*
**pedigree**[2] ['pedɪgri:] *adj k.t.* cins, damazlıq, döllük; ~ **cattle** cins / döllük / damazlıq heyvan; ~ **farm** *k.t.* döllük mal-qara ferması; ~ **seed** *k.t.* seçmə toxum
**pedigreed** ['pedɪgri:d] *adj* cins; ~ **horse** cins at; ~ **cattle** cins mal-qara; ~ **dogs** cins itlər
**pedlar** ['pedlə^r] *n* **1.** çərçi, xırdavatçı, səyyar alverçi; **2.** şayiəyayan, şayiəgəzdirən, dedi-qoduçu, qeybətçi; **3.** pis / bacarıqsız işçi
**pee**[1] [pi:] *n* **I** p [pi:] hərfinin adı
**pee** [pi:] *n* **II** *d.d.* sidik
**pee**[2] [pi:] *v (pt, pp* **peed)** *d.d.* siymək, işəmək
**peek**[1] [pi:k] *n* ötəri / cəld / oğrun baxış; **to give a quick** ~ oğrun / ötəri baxmaq; *He gave a peek at the girl O, qıza oğrun / ötəri baxdı*
**peek**[2] [pi:k] *v* **1.** ötəri / oğrun baxmaq, göz yetirmək; **2.** baxmaq, nəzər salmaq; *We peeked at the price Biz qiymətə baxdıq / nəzər saldıq*
**peel**[1] ['pi:l] *n* **I** qabıq; **lemon / orange / apple / potato,** ***etc.*** ~ limon/portağal/alma/kartof və s. qabığı
**peel** ['pi:l] *n* **II** çörəkçi kürəyi
**peel**[2] ['pi:l] *v* **1.** qabığını soymaq; **to** ~ **a banana / an apple / a potato / a cucumber** ***etc.*** bananın / almanın / kartofun / xiyarın *və s.*-in qabığını soymaq; **2. (off)** soyulmaq; qabıqdan çıxmaq; *My skin always peels when I've been in the sun Mən günəş altında olduqda həmişə qabığım soyulur;* **3.** *d.d.* çıxartmaq, soyunmaq; *The children peeled off their clothes and jumped into the water Uşaqlar paltarlarını soyundular və suya atıldılar / tullandılar*
**peeled** ['pi:ld] *adj* **1.** qabığı alınmış / soyulmuş, qabıqdan çıxarılmış; ~ **wood** qabığı alınmış ağac; ~ **fruit / vegetable** qabığı soyulmuş meyvə / tərəvəz; **2.** köhnəlmiş, dağılmış, yırtılmış, geyilmiş *(paltar haq.)*; **3.** bitkisiz, çılpaq; ~ **cliffs** çılpaq sıldırım qayalar; **4.** dilənçi, kasıb, yoxsul;
◊ **to keep** ***one's*** **eyes** ~ gözdən qaçırmamaq; göz-qulaq / sayıq olmaq; ≅ gözü-qulağı dik olmaq, ehtiyatlı olmaq
**peeler** ['pi:lə^r] *n k.t.* qabıqsoyan/qabıqalan maşın; **potato** ~ kartofsoyan maşın
**peelings** ['pi:lɪŋz] *n* qabıq *(xüs. meyvə və kartofda)*
**peep**[1] [pi:p] *n* **I 1.** ötəri / ani / oğrun baxış; **to get a** ~ **of** ***smth.*** bir şeyi ötəri görmək; *We got a peep of the house through the trees Biz ağacların arasından evi ötəri gördük;* **to have / to take a** ~ **at** ***smth.*** bir şeyə ötəri baxmaq, bir şeyə nəzər salmaq; **to have a** ~ **through the window** pəncərədən içəri baxmaq; **2.** işıltı, parıltı; ~ **of day / dawn** dan, şəfəq, şəfəqin sökülməsi/işıltısı
**peep** [pi:p] *n* **II 1.** ciyilti, civilti; **2.** zəif / güclə eşidilən səs;
◊ *Don't let me hear another peep out of you* ≅ *Bir də səsin / səsiniz çıxmasın; Nobody has*

*heard a peep from you Heç səsin-sorağın / səsiniz-sorağınız gəlmir*

**peep²** [pi:p] *v* I **1.** baxmaq, oğrun baxmaq *(xüs. balaca deşikdən)*; **to ~ through the keyhole** açar yerindən içəri baxmaq; **to ~ at a secret document** gizli sənədə oğrun baxmaq; *She moved the curtain a little and peeped out O, pərdəni azca araladı və çölə / bayıra baxdı*; **2.** çıxmaq, peyda olmaq; *The moon peeped out from behind the clouds Ay buludların arasından çıxdı; Green shoots are peeping through the soil Yaşıl zoğlar torpaqdan çıxır / baş qaldırır*

**peep** [pi:p] *v* II civildəmək, cikkildəmək, cik-cik etmək; *Sparrows peep Sərçələr cikkildəyirlər / cik-cik edirlər*

**peeper** [ˈpi:pəʳ] *n* I oğrun baxan/ maraqlanan adam

**peeper** [ˈpi:pəʳ] *n* II **1.** çığıran, çığvığçı; **2.** cücə, çolpa; göyərçin balası

**peer¹** [pɪəʳ] *n* tay, bərabər; tay-tuş, cur; *You will not find his peer Sən / Siz ona tay tapa bilməyəcəksən / bilməyəcəksiniz*; **to gain the respect of *one's* ~s** tay-tuşlarının hörmətini qazanmaq

**peer²** [pɪəʳ] *v* **1.** diqqətlə / dörd gözlə baxmaq, diqqət vermək; **to ~ at *smb.* over *one's* glasses** eynəyinin üstündən bir kəsə diqqətlə baxmaq; **to ~ through a gap / out of the window / over the wall** yarıqdan / pəncərədən (bayıra) divarın üstündən baxmaq; **to ~ into *smb.'s* face** bir kəsin üzünə diqqətlə baxmaq; **2.** baxmaq, göz gəzdirmək / yetirmək; *He peered into the room O, otağa göz gəzdirdi*; **3.** görünmək, peyda olmaq; **a vast white cloud, through which the sun ~ed** böyük ağ bulud topasının arasından görünən günəş

**peerage** [ˈpɪərɪdʒ] *n* perlər *(İngiltərədə, Fransada yüksək zadəgan titulu)* zümrəsi /silki / təbəqəsi; aristokratlar, zadəganlar; **to inherit a ~** irsən per titulu almaq

**peeress** [ˈpɪərɪs] *n* per arvadı

**peerless** [ˈpɪəlɪs] *adj* misilsiz, müqayisə edilməz/olunmaz, tayı-bərabəri olmayan, çox gözəl / qəşəng, əla; **a ~ performance** tayı-bərabəri olmayan / əla tamaşa

**peeve¹** [pi:v] *(xüs. passivdə işlənir) n amer. d.d.* acıqlanma, əsəbiləşmə; qıcıqlanma; əsəbi vəziyyət; **to have a ~ on *smb.*** bir kəsə acıqlanmaq

**peeve²** [pi:v] *v d.d.* **1.** əsəbiləşdirmək, acıqlandırmaq, cana gətirmək, zəhlə tökmək; *That peeves me considerably O, məni lap/olduqca əsəbiləşdirir*; **2.** acıqlanmaq, əsəbiləşmək

**peeved** [pi:vd] *adj* acıqlı, hirsli; *He seems peeved this morning O bu səhər əsəbi / acıqlı görünür*

**peevish** [ˈpi:vɪʃ] *adj* **1.** deyingən, davakar, dalaşqan, cəncəl, öcəşkən; tündməcaz, əsəbi; *His state of health makes him fretful and peevish Səhhətinin pis olması onu deyingən və əsəbi edir*; **2.** çətin, tərs, qılıqsız, yolagetməyən, bədrəftar; **a ~ child** çətin / bədrəftar uşaq

**peewee** [ˈpi:wi:] *n amer d.d.* **1.** kiçikboylu adam; **2.** balaca heyvan

**peg¹** [peg] *n* **1.** paya; **tent ~** çadır çökmək üçün paya; **2.** ağac mıxça / mıx; çəkmə mıxı; **3.** paltarasan; paltarasanın qarmağı; *Hang your coat on the peg by the door Paltonu / Paltonuzu qapının yanındakı paltarasandan as / asın*; **4.** aşıq, qulaq *(musiqi alətlərində)*; **5.** violonçelin dayanacağı; **6.** *d.d.* ayaq, ağac ayaq, ağacayaqlı adam; **7.** *pl amer. d.d.* şalvar, tuman;

◊ **to buy *(clothes)* off the ~** hazır paltar almaq; **to come down a ~** tonu aşağı salmaq; **to raise *smb.* a ~ higher** bir kəsi yuxarı qaldırmaq *(vəzifədə)*; **~ in a round hole** öz yerində olmayan adam

**peg²** [peg] *v* **(-gg-) 1.** *(xüs. passivdə işlənir)* payalamaq, paya vurmaq, mıxlamaq; *Peg a tent to the ground Çadırı yerə mıxla / mıxlayın*; **2.** qiymət qoymaq / müəyyən etmək; **to ~ the market** bazar qiymətini müəyyən səviyyədə saxlamaq; **3.** qarmaq atmaq *(balıq tutmaq üçün)*; **4.** *jarq.* atmaq, qamçılamaq; *He pegged a stone at me O mənə daş atdı*

**pegged** [pegd] *adj* **1.** mıxlanmış, mismarlanmış, bərkidilmiş; **2.** *jarq.* süni yolla saxlanılan *(qiymət və s. haq.)*; **~ exchange** süni yolla saxlanılan valyuta kursu; **~ price** süni yolla saxlanılan qiymət

**pejorative** [pɪˈdʒɔrətɪv, -ˈdʒɔ:r-] *adj* **1.** *dilç.* kiçiltmə bildirən; **~ suffixes** kiçiltmə bildirən suffikslər; **2.** ədəbsiz, nalayiq, alçaldıcı; **~ words** ədəbsiz / nalayiq sözlər

**pelican** [ˈpelɪkən] *n zool.* qutan

**pellagra** [pəˈlægrə] *n tib.* pellaqra *(PP vitaminin çatışmaması nəticəsində törəyən xəstəlik)*

**pell-mell¹** [ˌpelˈmel] *n* qarışıqlıq, dolaşıqlıq, qarmaqarışıqlıq, hərc-mərclik, nizamsızlıq

**pell-mell²** [ˌpelˈmel] *adj* qarışıq, dolaşıq, qarmaqarışıq; nizamsız; **a ~ classification** dolaşıq / qarışıq təsnifat; **~ attack** *hərb.* nizamsız / qarma-qarışıq hücum

**pell-mell³** [ˌpelˈmel] *adv* **1.** nizamsız, pozğun, necə gəldi; **2.** bərk, cəld, iti çaparaq / qaçaraq; *The children rushed pell-mell down the stairs Uşaqlar pilləkənlərlə cəld aşağı qaçdılar*

**pellucid** [pəˈlu:sɪd] *adj* **1.** şəffaf; **~ ice** şəffaf buz; **2.** aydın, açıq; **~ style** aydın üslub; **3.** təmiz, tərtəmiz; **~ skin** təmiz dəri; **4.** duru; **~ water** duru su

**pelt¹** [pelt] *n* I dəri *(yunu üstündə olan)*

**pelt** [pelt] *n* II **1.** atma, tullama, tolazlama; **2.** güclü zərbə; **3.** yağışın və ya dolunun səsi;

◊ **in / at full ~** çox sürətlə / cəld, ildırım kimi, bərk çaparaq

**pelt²** [pelt] *v* **1.** atmaq, tolazlamaq; *The girls were pelted with snowballs Qızlara qartopu atdılar, Qızları qartopuna tutdular*; **2.** yağdırmaq; *He was pelted with questions Onun üstünə sual yağdırdılar*; **3.** döymək, döyəcləmək *(yağış, dolu və s. haq.)*; *The smith was pelting away at hot iron Dəmirçi isti dəmiri döyəcləyirdi*; **4.** şığımaq, hücum etmək; götürülmək, qaçıb getmək



**pelves** [ˈpelvi:z] **pelvis** *isminin cəm forması*

**pelvic** [ˈpelvɪk] *adj* çanaq, çanaq sümüyü; **~ bones** çanaq sümükləri

**pelvis** [ˈpelvɪs] *n (pl* **-ves)** *anat.* çanaq

**pen¹** [pen] *n* I **1.** pero, qələm, qələmucu; **a ball-point ~** diyircəkli qələm; **2.** ədəbi əsər; **to live by *one's* ~** ədəbi əsər yazmaqla dolanmaq / yaşamaq; *He lives by his pen O, qələmilə yaşayır / dolanır*;

◊ **to put / to set ~ to paper, to take ~ in hand** qələmi ələ almaq, qələmə sarılmaq, yazmağa başlamaq

**pen** [pen] *n* II **1.** *k.t.* otlaq sahəsi; örüş; **2.** küz, ağıl *(mal-qara üçün)*; **3.** damba, torpaq bənd; bənd, dəhnə; **4.** polis məntəqəsində həbs olunanları saxlamaq üçün otaq

**pen** [pen] *n* III qu *(dişisi)*

**pen** [pen] *n* IV *amer. jarq.* həbsxana, qala, qazamat

**pen²** [pen] *v* **(-nn-)** I yazmaq; **to ~ a letter** məktub yazmaq; *She penned a long letter O, uzun bir məktub yazdı*

**pen** [pen] *v* II **1.** dama/hinə/küzə/ağıla salmaq, damlamaq; **to ~ up hens for the night** axşam toyuqları dama/hinə salmaq; **to ~ sheep** qoyunları küzə salmaq; **2.** bənd / damba tikmək

**penal** [ˈpi:nl] *adj* **1.** cəzalanmalı, cəzaya layiq, cəzalandırıla bilən; cinayət; **~ code** cinayət məcəlləsi/kodeksi; **~ laws** cinayət qanunları; **2.** ağır; **a new and ~ tax** yeni və ağır vergi

**penalization, -sation** [ˌpi:nəlaɪˈzeɪʃn] *n* cərimə, cərimələmə, cərimə etmə *(oyunlarda)*

**penalize, -ise** [ˈpi:nəlaɪz] *v* **1.** cəzalandırmaq, cəza vermək; **2.** cərimələmək, cərimə etmək / kəsmək

**penalty¹** [ˈpenltɪ] *n* **1.** cəza; tənbeh; **maximum / minimum ~** maksimum/minimum cəza; **death ~** ölüm cəzası; **small ~** yüngül cəza; **misconduct ~** *id.* oyunçunu meydandan kənar etmə / çıxartma cəzası; **2.** cərimə; **~ for non-performance of contract** kontraktı yerinə yetirməməyə görə cərimə

**penalty²** [ˈpenltɪ] *adj* cərimə; **~ kick** cərimə zərbəsi; *The referee awarded a penalty (kick) to the home team Hakim meydan sahiblərinin komandasının qapısına cərimə zərbəsi təyin etdi*; **~ area** *(həm də* **~ box)** cərimə meydançası *(futbol oyununda)*; **~ bench** *id.* meydandan / oyundan çıxarılan oyunçular üçün skamya

**penance** [ˈpenəns] *n* **1.** *kils.* dini cəza *(uzun ibadətlər, pəhriz və s.)*; **2.** tövbə, tövbə etmə; **to do ~ for *one's* sins** günahlarını təmizləmək / yumaq üçün tövbə etmək; **to do / to perform ~ for *smth.*** bir şeyə görə tövbə etmək; **3.** peşmanlıq; təəssüf; **4.** günahını təmizləmə, bağışlanma

**pen-and-ink¹** [ˈpenəndˈɪŋk] *n* **1.** yazı ləvazimatı; **2.** ədəbi iş; **a man of ~** ədəbiyyatçı, ədib; **3.** qələmlə çəkilmiş şəkil

**pen-and-ink²** [ˌpenəndˈɪŋk] *adj* **1.** qələmlə çəkilmiş; **~ drawing** qələmlə çəkilmiş şəkil; **2.** yazılmış, yazıya alınmış; **~ conversation** yazılmış / yazıya alınmış söhbət

**pen-case** [ˈpenkeɪs] *n* qələmdan, qələmqabı

**pencil¹** [ˈpensl] *n* **1.** karandaş; **to write in ~** karandaşla yazmaq; **coloured ~** rəngli karandaş; **eyebrow ~** qaş karandaşı; *Pencil rubs out easily Karandaş asan silinir*; **2.** *rəs.* fırça; **3.** üslub, tərz *(yazıçının, rəssamın)*

**pencil²** [ˈpensl] *v* **1.** çəkmək, rəngləmək; **2.** yazmaq, qeyd etmək; **3.** *tib.* yaranı fırça ilə təmizləmək

**pencil-case** [ˈpenslkeɪs] *n* qələmqabı, qələmdan

**pencil-sharpener** [ˈpenslʃa:pnəʳ] *n* qələmyonan

**pendant¹** [ˈpendənt] *n* **1.** asma, asma bəzək; klon, brelok *(saat zəncirindən, bilərzikdən və s. asılan bəzək)*; **2.** əlavə; *This article is a pendant to his paper Bu məqalə onun məruzəsinə əlavədir*; **3.** açarlar üçün halqa

**pendant²** [ˈpendənt] *adj* **1.** asılan, asılı, sallaq, asma; **~ boughs** sallaq budaqlar; **2.** əyilmiş, sallanmış; dağılan, uçulan, sökülən; **a ~ tower** uçulan /dağılan qüllə; **3.** həll olunmamış, həllini gözləyən; **~ dispute** həll olunmamış mübahisə

**pending¹** [ˈpendɪŋ] *adj* baxılan, baxılmaqda olan, həllini gözləyən; həll olunmamış; qurtarmamış; **negotiations ~ between two countries** iki dövlət arasında gedən danışıqlar; *The treaty was still pending Müqavilə hələ imzalanmamışdı*; **~ bills** *amer.* konqresin müzakirəsində olan qanun layihəsi

**pending²** [ˈpendɪŋ] *prep* **1.** müddətində, ərzində, dövründə; **~ these negotiations** bu danışıqlar müddətində / ərzində; **2.** əsnasında; -a / -ə qədər; **~ the issue of the book** kitabın çıxmasına qədər; **~ his arrival** o gələnə qədər, onun gəlişi əsnasında

**pendulous** [ˈpendjuləs] *adj* sallanan, sallaq, asılan; **~ nests** sallanan yuvalar; **~ belly** sallaq qarın; **~ breasts** sallaq / sallanan döşlər

**pendulum** [ˈpendjələm] *n* kəfkir, rəqqas *(saatda və s.)*; nizam çarx *(cib saatında)*

**penetrable** [ˈpenɪtrəbl] *adj* **1.** görünə bilən, görünən; **the highest ~ point of the bay** buxtanın ən yaxşı görünən nöqtəsi; **2.** dərk edilə bilən; **~ mystery** dərk edilə bilən sirr

**penetrate** [ˈpenɪtreɪt] *v* **1.** daxil olmaq, yarıb keçmək, içərisinə keçmək; *Our troops have penetrated deep into the enemy territory Bizim qoşunlar düşmən ərazisinin içərilərinə daxil olub*; **2.** keçmək, deşib keçmək; *The heavy rain had penetrated right through her coat Güclü yağış onun paltosuna keçmişdi / paltosunu tamam islatmışdı; The bullet penetrated his lung Güllə onun ağciyərini deşib keçdi*; **3.** dərk etmək, başa düşmək; **to ~ into the secrets of nature** təbiətin sirlərini dərk etmək; *It was impossible to penetrate the mystery Sirri başa düşmək/dərk etmək mümkün deyildi*

**penetrating** [ˈpenɪtreɪtɪŋ] *adj* 1. güclü, kəskin; şiddətli; ~ **smell** güclü /kəskin iy; *The cold is penetrating today Bu gün soyuq iliyə işləyir*; 2. iti; ağıllı, fərasətli; **a ~ mind** iti ağıl/zəka; **a ~ thinker** ağıllı mütəfəkkir; **a ~ look / glance / stare** iti baxış; **a ~ eye** iti göz; 3. güclü, şiddətli, qulaqbatıran; ~ **wind** güclü/şiddətli külək; **a ~ cry** qulaqbatıran səs; 4. dərin, iki tərəfi açıq; ~ **wound** dərin / iki tərəfi açıq yara

**penetration** [ˌpenɪˈtreɪʃn] *n* 1. keçmə, girmə; soxulma; daxil olmanın dərinliyi *(yara haq.)*; 2. fərasət, ağıllılıq, fərasətlilik, gözüaçıqlıq; **a person of ~** fərasətli / ağıllı / gözüaçıq adam; 3. *fiz.* nüfuz etmə qabiliyyəti, keçicilik; 4. *hərb.* yarma, yarıb keçmə *(cəbhəni)*; 5. deşmə / deşib keçmə gücü; ~ **of a bullet** *hərb.* güllənin / mərminin deşmə gücü

**penetrative** [ˈpenɪtrətɪv] *adj* 1. girən, daxil olan; hiss üzvlərinə təsir edən; 2. kəskin, qulaqbatıran *(səs haq.)*; 3. ağıllı, fərasətli, gözüaçıq, açıqgözlü; ~ **understanding** dərindən anlama/başa düşmə

**pen-friend** [ˈpenfrend] *n* məktub dostu *(məktub vasitəsilə tapılan)*

**penguin**[1] [ˈpeŋgwɪn] *n zool.* pinqvin

**penicillin** [ˌpenɪˈsɪlɪn] *n əcz.* penisillin

**peninsula** [pəˈnɪnsjələ] *n* yarımada

**peninsular**[1] [pəˈnɪnsjələr] *n* yarımada sakinləri, yarımadada yaşayan adamlar

**peninsular**[2] [pəˈnɪnsjələr] *adj* yarımada, yarımada kimi, yarımadaya oxşar/bənzər

**penis** [ˈpiːnɪs] *n (pl* **penes**) penis, erkəklərdə cinsi orqan

**penitence** [ˈpənɪtəns] *n* 1. peşmanlıq, təəssüf; 2. *din.* tövbə, tövbə etmə; **to show ~ for *one's* sins** günahlarına görə tövbə etmək

**penitent**[1] [ˈpenɪtənt] *n* 1. *din.* tövbə edən günahkar; 2. peşmançılıq çəkən adam

**penitent**[2] [ˈpenɪtənt] *adj* tövbə edən, peşman olan; **a ~ sinner** tövbə edən günahkar

**penitential** [ˌpenɪˈtenʃl] *adj* tövbə, günahı yüngülləşdirən; **a ~ life** günahı yüngülləşdirən həyat

**penitentiary** [ˌpenɪˈtenʃərɪ] *n* islah evi, həbsxana, qazamat

**penknife** [ˈpennaɪf] *n (pl* **-knives** [-naɪvz]) qələm / cib bıçağı

**penman** [ˈpenmən] *n (pl* **-men** [-mən]) kalliqraf, xəttat *(gözəl xətlə yazan adam)*

**penmanship** [ˈpenmənʃɪp] *n* 1. kalliqrafiya, xəttatlıq *(gözəl xətlə yazma sənəti)*; 2. üslub, yazıçının yazı tərzi; **to recognize *smb.'s* ~** bir kəsin üslubunu tanımaq

**pen-name** [ˈpenneɪm] *n* ədəbi təxəllüs

**penniless** [ˈpenɪlɪs] *adj* pulu olmayan; pulsuz, qəpiksiz; **to leave *smb.* ~** bir kəsi qəpiksiz qoymaq

**penny** [ˈpenɪ] *n (pl* **pence**; **pennies**); ayrı-ayrı dəmir pul; penni *(pens)*; *amer.* sent;

◊ **a pretty ~** böyük məbləğ, xeyli pul; **to make a pretty ~ out of *smth.*** bir şeydən yaxşı gəlir / qazanc götürmək; **to inherit/to come in for a pretty ~** irsən böyük var-dövlət almaq/oldə etmək; **a bad ~** 1) saxta sikkə; 2) yaramaz adam; **to turn an honest ~** 1) halal pul qazanmaq; 2) əlavə pul qazanmaq; **to look twice at every ~** ≅ hər bir qəpiyin qədrini bilmək, hər qəpiyin üstündə əsmək; *Take care of the pence, and the pounds will take care of themselves at. söz.* ≅ *Qəpiyin qədrini bilsən, manat öz qədrini özü biləcək*

**pension**[1] [ˈpenʃn] *n* pensiya, təqaüd; **old age ~** qocalığa görə pensiya / təqaüd; **an army ~** hərbi xidmətə görə təqaüd; **to live on a ~** təqaüdlə yaşamaq / dolanmaq; **to retire on a ~** təqaüdə çıxmaq; **to draw *one's* ~** təqaüdünü almaq; **to grant a ~ to *smb.*** bir kəsə təqaüd kəsmək/təyin etmək

**pension**[2] [ˈpenʃn] *v* **(off)** təqaüdə çıxartmaq; təqaüd vermək, pul buraxmaq; *He was pensioned off and his job was given to a younger man Onu təqaüdə çıxartdılar və işini daha cavan adama verdilər*

**pensionable** [ˈpenʃənəbl] *adj* 1. təqaüd almağa hüquq verən; ~ **disability** təqaüd almağa hüquq verən əlillik; ~ **age** təqaüd yaşı; *She is of pensionable age O, təqaüd yaşındadır*; 2. təqaüd almağa hüququ olan; *He was not pensionable Onun təqaüd almaq hüququ yox idi*

**pensioner** [ˈpenʃənər] *n* təqaüdçü, pensiyaçı; **an old-age ~** qocalıq təqaüdü alan *(adam)*

**pensive** [ˈpensɪv] *adj* fikirli, qəmli, kədərli; melanxolik; ~ **eyes** qəmli /kədərli gözlər; **a ~ look** fikirli baxış; **a ~ mood** melanxolik ovqat

**pensively** [ˈpensɪvlɪ] *adv* qəmli, kədərli, qəmli-qəmli, kədərli-kədərli; həzin-həzin

**pentagon** [ˈpentəgən] *n* 1. beşbucaqlı *(cisim)*; **the Pentagon** Pentaqon *(ABŞ-ın müdafiə nazirliyi)*; 2. *məc.* Amerika hərbçiləri

**pentagonal** [ˈpentægənl] *n adj* beşbucaqlı

**pentagram** [ˈpentəgræm] *n* pentaqram *(hər tərəfində bərabəryanlı üçbucağı olan beşbucaqlı)*

**pentameter** [penˈtæmɪtər] *n ədəb.* pentametr *(beştaktlı şer)*

**pentathlon** [penˈtæθlən] *n id.* beşnövçülük, beş növ idman oyunundan ibarət yarış

**penthouse** [ˈpenthaus] *n* 1. göydələnin damında tikilmiş ev *(xudmani, bir ailəlik)*; 2. evin damında tikiliş *(lift, bak və s. qoymaq üçün)*

**penultimate** [penˈʌltɪmɪt] *adj* axırıncıdan qabaqkı; *November is the penultimate month of the year Noyabr ilin axırdan qabaqkı ayıdır*

**penurious** [pəˈnjuərɪəs] *adj* kasıb, yoxsul; **a ~ family** kasıb / yoxsul ailə

**penury** [ˈpenjərɪ] *n* kasıblıq, yoxsulluq, ehtiyac; **to live in ~** ehtiyac / yoxsulluq içərisində yaşamaq

**peony** [ˈpɪənɪ] *n bot.* pion *(iri qırmızı və ya ağ çiçəkli bəzək bitkisi)*

**people**[1] [ˈpiːpl] *n* 1. xalq, millət; **the British /**



**Russian / French ~** Britaniya / rus / fransız xalqı / milləti; **English-speaking ~s** ingilis dilli / ingiliscə danışan xalqlar; **a warlike ~** davakar/döyüşkən /cəngavər xalq; *The Spartans were a warlike people Spartalılar döyüşkən / cəngavər xalq idi*; 2. sakin; **the ~ of London** Londonun sakinləri; 3. *top.i* adamlar, insanlar, camaat; **young ~** cavanlar; **old ~** qocalar; **common ~** adi adamlar; **many ~** çoxlu adamlar; *Were there many people at the party? Qonaqlıqda adam çox idimi? Many old people live alone Qoca adamların çoxu tək yaşayır; He meets a lot of famous people in his job O, işində bir çox məşhur adamlarla qarşılaşır; Who are these people? Bu adamlar kimdirlər?* 4. *(Fel adət. cəmdə işlənir) d.d.* qohumlar; valideynlər; *My people are abroad Mənim valideynlərim xaricdədir*; **my wife's ~** arvadımın qohumları; 5. *top.i* qulluqçular; xidmətçilər, nökərlər; **an employer and his ~** sahibkar və onun xidmətçiləri; **a farmer and his ~** fermer və onun işçiləri; **an officer and his ~** zabit və onun əsgərləri

**people**[2] [ˈpiːpl] *v* 1. yaşamaq, məskunlaşmaq; **human beings who ~ our planet** bizim planetdə yaşayan / məskunlaşan insanlar; *His race has peopled this island through the centuries Onun mənsub olduğu irq əsrlərlə bu adada məskunlaşıb / yaşayıb*; 2. artmaq *(əhali haq.)*; *The town has peopled very fast Bu şəhərin əhalisi çox sürətlə artıb*

**peopled** [ˈpiːpld] *adj* məskunlaşmış, məskunlaşdırılmış, əhali yerləşdirilmiş; **densely / thinly ~ country** əhalisi sıx / seyrək olan ölkə

**people-in-law** [ˈpiːplɪnˈlɔː] *n d.d.* ərin və ya arvadın qohumları

**pep**[1] [pep] *n d.d.* cəsarət, ruh yüksəkliyi; qətiyyət; **full of ~** cəsarətli, qətiyyətli; **to put some ~ into *smb.*** bir kəsi ruhlandırmaq, bir kəsi cəsarətləndirmək, cəsarət vermək; *The captain was trying to put some pep into the team Kapitan komandanı ruhlandırmağa çalışırdı*

**pep**[2] [pep] *v (-pp-; pt, pp) d.d.* həvəsləndirmək, stimullaşdırmaq, ruhlandırmaq, cəsarətləndirmək, ruh / cəsarət vermək; **to ~ up *smb.*** bir kəsi ruhlandırmaq; *I was pepped up at the idea Bu fikir məni ruhlandırdı / mənə cəsarət verdi*

**pepful** [ˈpepfl] *adj d.d.* çevik, zirək, qıvraq; diribaş; **~ boy** zirək / diribaş oğlan

**pepper**[1] [ˈpepər] *n bot.* istiot; bibər; **~s stuffed with meat and rice** ət və düyü ilə doldurulmuş bibər, bibər dolması

**pepper**[2] [ˈpepər] *v* 1. istiotlamaq, istiot vurmaq / səpmək / tökmək; 2. **(with)** *(həm də məc.)* atmaq, yağdırmaq; *The speaker was peppered with questions Natiqin üstünə sual yağdırdılar*; 3. vurmaq; atəş açmaq; *He peppered away at the pheasants O, qırqovulları vurdu, O, qırqovullara atəş açdı*

**peppered** [ˈpepəd] *adj* 1. istiot vurulmuş / səpilmiş; 2. xalla örtülmüş, xallı; **~ tail** xallı quyruq; 3. hirsli, tündxasiyyət, tündməcaz, tez hirslənən/ özündən çıxan; **~ tongue** acı / zəhərli dil

**pepper-mill** [ˈpepəmɪl] *n* istiotçəkən / istiotdöyən maşın

**pepper-pot** [ˈpepəpɔt] *n* istiotqabı

**peppery** [ˈpepərɪ] *adj* 1. istiotlanmış, istiotlu; istiot səpilmiş /vurulmuş/ qatılmış; 2. kəskin, tikanlı; **~ words** kəskin / tikanlı sözlər; **~ satire** kəskin satira; 3. çılğın, hirsli, tündxasiyyət, tündməcaz, tez hirslənən; **a ~ man** tündməcaz adam; **a ~ old colonel** tündməcaz qoca polkovnik

**perambulation** [pəˌræmbjuˈleɪʃn] *n* yeriş, yerimə, hərəkət etmə; gəzinti; **daily ~s** gündəlik gəzintilər

**perambulator** [ˈpræmbjuleɪtər] *n* uşaq arabası

**perceive** [pəˈsiːv] *v* 1. başa düşmək, dərk etmək; hiss etmək; *She perceived that her sister was unhappy O, başa düşdü ki, onun bacısı bədbəxtdir; I perceived someone standing behind me Mən hiss etdim ki, kimsə mənim arxamda durur*; 2. fərqləndirmək; görmək; *They perceived some light in the distance Onlar uzaqda bir işıq gördülər*

**per cent** [pəˈsent] *adj* faiz, %; **three ~** üç faiz (3%); **a fifty ~ (50%) increase in price** qiymətdə əlli faiz (50%) artım

**percentage** [pəˈsentɪdʒ] *n* 1. faiz miqdarı; **the ~ of metal in the ore** filizin tərkibində metalın faiz miqdarı; 2. *d.d.* pay; hissə, miqdar; *The salesmen get a percentage on everything they sell Satıcılar satdıqları hər bir şeydən pay alırlar; A small percentage of people came Adamların az bir hissəsi gəldi*; 3. *amer. d.d.* fayda, mənfəət

**perceptibility** [pəˌseptəˈbɪlɪtɪ] *n* hiss oluna bilmə, hiss olunma; gözə çarpma; qavrama qabiliyyəti

**perceptible** [pəˈseptɪbl] *adj* hiss olunan, duyulan, gözəçarpan, nəzəri cəlb edən, fərqləndirilə bilən; dərk edilə / qavranıla bilən; **~ difference** duyulan / gözəçarpan / nəzəri cəlb edən fərq; **~ sounds** fərqləndirilə bilən səslər; **a ~ change** gözəçarpan dəyişiklik; **a ~ improvement** gözəçarpan yaxşılaşma

**perceptibly** [pəˈseptɪblɪ] *adv* gözə çarpacaq tərzdə / dərəcədə; *The patient has improved perceptibly Xəstə gözə / nəzərə çarpacaq dərəcədə yaxşılaşıb*

**perception** [pəˈsepʃn] *n* 1. qavrama, qavrayış; duyğu, hiss; **organs of ~** duyğu/lamisə üzvləri; **colour ~** rəngləri qavrama; 2. qavrama/hiss etmə qabiliyyəti; 3. anlayış, başa düşmə, dərk etmə, anlama; **~ of beauty** gözəlliyi anlama / başa düşmə; *Our perceptions of the world around us are constantly changing Bizi əhatə edən dünya/aləm haqqındakı anlayışlarımız mütəmadi olaraq dəyişir*

**perceptive** [pəˈseptɪv] *adj* 1. hissedici, hissedən; duyan; **~ organs** düyğu üzvləri; 2. açıqgözlü, gözüaçıq; diqqətli, hər şeyə fikir verən; *It's*

*very perceptive of you to notice that Onu görməyin / görməyiniz sənin / sizin çox gözüaçıq olduğunu / olduğunuzu göstərir*

**perceptively** [pə'septɪvlɪ] *adv* gözüaçıqlıqla, açıqgözlülüklə, fərasətlə

**perceptiveness** [pə'septɪvnɪs] *n* fərasət, gözüaçıqlıq, ağıllılıq; **to show rare** ~ nadir fərasət / gözüaçıqlıq nümayiş etdirmək

**perch**¹ [pə:tʃ] *n* I 1. tar *(quş qəfəsində / hinində)*; **to take** ***one's*** ~ tarına oturmaq; *The parrot shuffled along its perch Tutuquşu tarında o yan bu yana gedirdi / vurnuxurdu*; 2. *d.d.* yüksək vəzifə / mövqe; 3. qozla, hündür oturacaq; 4. *tex.* draqa *(yerqazan maşın)*;

◊ *Come off your perch! Burnunu dik / yuxarı tutma!, Lovğalanma!*; **to hop the** ~ ölmək; **to throw / to turn over the** ~ başını batırmaq / əkmək, evini yıxmaq

**perch** [pə:tʃ] *n* II *zool.* xanı balığı

**perch**² [pə:tʃ] *v* 1. tarda oturmaq, tara çıxmaq, tarlanmaq; tara çıxartmaq; 2. əyləşmək, oturmaq; **to** ~ **on the arm of a chair** kreslonun qolu üstündə oturmaq; *We had to perch on high stools at the bar Biz barda hündür stullarda oturmalı olduq*; 3. qoymaq; **to** ~ ***one's*** **hat on the side of** ***one's*** **head** papağını yan / yanakı qoymaq

**percipient** [pə'sɪpɪənt] *adj* tez anlayan / qavrayan / başa düşən; **a** ~ **onlooker** tez anlayan nəzarətçi

**percolate** ['pə:kəleɪt] *v* 1. sızmaq, süzülmək, sızıb /süzülüb keçmək; keçmək, hopmaq; *Water percolates through the sand Su qumdan sızıb keçir*; 2. yayılmaq; *The news took some time to percolate through Xəbərin yayılması bir müddət vaxt aldı*

**percolation** [.pə:kə'leɪʃn] *n* sızma, sızıb keçmə, keçmə, süzülmə *(maye haq.)*

**percolator** ['pə:kəleɪtə'] *n* qəhvədan, qəhvə bişirmək üçün qab

**percussion** [pə'kʌʃn] *n* 1. zərbə, toqquşma; 2. *top.i mus.* zərb alətləri

**percussionist** [pə'kʌʃənɪst] *n* zərb aləti çalan

**perdition** [pə:'dɪʃn] *n* 1. *din.* əbədi günah; 2. tələf / məhv / həlak olma, ölüm

**perdurable** [pə'djuərəbl] *adj* 1. əbədi, daimi, ömürlük; 2. çox möhkəm

**peregrinate** ['perɪgrɪneɪt] *v* səyahət etmək, gəzmək, gəzib dolaşmaq; veyllənmək, avara gəzmək; **to** ~ **the streets** küçələri avara-avara dolanmaq / gəzmək

**peregrination** [.perɪgrɪ'neɪʃn] *n* səyahət, səyahət etmə, gəzmə, səfər; **his ~s in southern Europe** onun cənubi Avropaya səyahətləri; *He published a book about his peregrinations O, səyahəti haqqında bir kitab nəşr etdi*

**peregrine** ['perɪgrɪn] *n* 1. qədim Romada yaşayan əcnəbi; 2. *zool.* şahin, tərlan, qızılquş

**peremptorily** [pə'remptərɪlɪ] *adv* amiranə bir tərzdə, qəti olaraq

**peremptory** [pə'remptərɪ] *adj* 1. qəti, etirazsız; *The orders are peremptory Əmrlər qətidir / ləğv edilə bilməz*; 2. amiranə; qəti; **in a** ~ **tone** amiranə bir tonda; **to speak in a** ~ **tone** amiranə tonla danışmaq

**perennial**¹ [pə'renɪəl] *n* 1. çoxillik bitki; 2. əbədi, həmişəlik, davamlı; **the ~s of poetry** poeziyanın əbədiliyi

**perennial**² [pə'renɪəl] *adj* 1. çoxillik *(bitki haq.)*; 2. bütün ili davam edən; ~ **supply of water** suyun daimi təminatı; 3. əbədi; ~ **youth** əbədi gənclik

**perennially** [pə'renɪəlɪ] *adv* həmişə, daim, həmişəlik, ömürlük; sönmədən

**perfect**¹ ['pə:fɪkt] *n qram.* perfekt *(bitmiş)*; **the present/past** ~ indiki / keçmiş perfekt

**perfect**² ['pə:fɪkt] *adj* I 1. bitmiş, kamil, qüsursuz; çox gözəl / qəşəng, əla; ~ **beauty** kamil / qüsursuz gözəllik; ~ **actress** çox gözəl/əla aktrisa; **a** ~ **person** qüsursuz adam; **to be** ~ **in everything** hər şeydə qüsursuz olmaq; *It's perfect! d.d. Əla, çox gözəl / qəşəng!*; 2. tam, tamam; ~ **silence** tam sakitlik; 3. dəqiq, düz; ~ **imitation** dəqiq təqlid; **a** ~ **copy** düzgün surət; 4. bitmiş, bitkin, mükəmməl; tam; ~ **bliss** tam xoşbəxtlik / səadət; **to have a** ~ **knowledge** of ***smth.*** bir şey haqqında bitkin / mükəmməl biliyə malik olmaq; **to have** ***one's*** **lessons** ~ dərslərini mükəmməl öyrənmək / bilmək; 5. *d.d.* çox gözəl / yaxşı, xoşagələn; **a** ~ **day** çox gözəl / qəşəng gün

**perfect** ['pə:fɪkt] *adj* II *qram.* perfekt; ~ **forms** perfekt formalar

**perfect**³ [pə'fekt] *v* 1. təkmilləşdirmək, yaxşılaşdırmaq; **to** ~ **an invention** ixtiranı təkmilləşdirmək; **to** ~ **a plan** planı yaxşılaşdırmaq / təkmilləşdirmək; *He went to Italy to perfect his singing voice O, səsini təkmilləşdirmək üçün İtaliyaya getdi*; 2. qurtarmaq, başa çatdırmaq, yerinə yetirmək; **to** ~ **a plan** planı yerinə yetirmək; *The plan was perfected in June Plan iyunda yerinə yetirildi*

**perfection** [pə'fekʃn] *n* 1. təkmilləşdirmə, yaxşılaşdırma; **the path to** ~ təkmilləşmənin yolu; 2. bitmə, sona çatma, tamamlanma; **to bring a work to** ~ işi bitirmək/tamamlamaq/qurtarmaq; 3. kamillik, qüsursuzluq; **the** ~ **of beauty** gözəlliyin kamilliyi / qüsursuzluğu; **a rare** ~ **of form** formanın nadir kamilliyi; **to attain** ~ kamilliyə çatmaq, kamillik əldə etmək

**perfectionism** [pə'fekʃənɪzm] *n* kamillik doktrinası

**perfectionist** [pə'fekʃənɪst] *n* 1. tələbkar, hər şeydə kamillik tələb edən adam, pedantlığa meylli adam; 2. kamillik tərəfdarı

**perfectly** ['pə:fɪktlɪ] *adv* 1. yaxşı, gözəl, əla; ~ **formed** yaxşı formalaşmış; *The trousers fit perfectly Şalvar yaxşı/əla tutur*; 2. kamil, tam, tamamilə; **to be** ~ **happy** tam xoşbəxt olmaq; **to be** ~ **safe** tam təhlükəsiz olmaq; **to be** ~ **right** tamamilə haqlı olmaq; ~ **well** çox yaxşı; *He knows perfectly well what I mean O mənim nə demək istədiyimi çox yaxşı bilir*



**perfidious** [pə'fɪdɪəs] *adj* xain, xəyanətkar; vəfasız, əhdi pozan, namərd; satqın; **a** ~ **woman** vəfasız/əhdi pozan qadın; ~ **dealing** satqın hərəkət

**perfidy** ['pə:fɪdɪ] *n* xainlik, xəyanətkarlıq, vəfasızlıq; **a piece / an action of** ~ xain / xəyanətkar / satqın hərəkət

**perforate** ['pə:fəreɪt] *v* deşmək, dəlmək, deşik /dəlik açmaq; **to** ~ **the paper** kağızı deşmək; **to** ~ **bricks** kərpicləri deşmək; *A metal spike has perforated the fuel tank Dəmir mıx yanacaq bakını deşib*

**perforated** ['pə:fəreɪtɪd] *adj* deşilmiş, dəlinmiş, deşikli, dəlikli; ~ **bricks** deşikli kərpiclər

**perforation** [.pə:fə'reɪʃn] *n* 1. deşmə, dəlmə, deşik / dəlik açma; dəlik, deşik; *Perforations are made by boring Deşiklər qazma vasitəsilə açılır*; 2. *pl* kino lentinin, markaların kənarında olan deşiklər

**perforative** ['pə:fərətɪv] *adj* 1. deşilmiş, dəlinmiş; 2. asan deşilən / dəlinən

**perforator** ['pə:fəreɪtə'] *n* 1. burğu, matqab; 2. deşikaçan, dəlikaçan; 3. deşikaçan / dəlikaçan dəzgah

**perforce** [pə'fɔ:s] *adv* lazım olduqda, istər-istəməz; *The reader must perforce make his own inferences Oxucu lazım olduqda / istər-istəməz özü nəticə çıxartmalıdır*

**perform** [pə'fɔ:m] *v* 1. yerinə yetirmək, icra / əməl etmək, həyata keçirmək; **to** ~ **a task** tapşırıq yerinə yetirmək / icra etmək; **to** ~ **useful work** faydalı iş görmək; **to** ~ **an operation** əməliyyat yerinə yetirmək; **to** ~ **an experiment** təcrübə aparmaq; **to** ~ **an obligation** borcu yerinə yetirmək; 2. oynamaq, ifa etmək *(rolu)*; çalmaq; **to** ~ **on the flute/at the piano** fleyta/pianino çalmaq; *He performed the part of Hamlet O, Hamlet rolunu oynadı / ifa etdi*

**performance** [pə'fɔ:məns] *n* 1. ifa, icra; ifa/ icra etmə, yerinə yetirmə, həyata keçirmə; **in the** ~ **of a task** tapşırığı yerinə yetirərkən; **in the** ~ **of an experiment** təcrübə apararkən; **to be faithful in the** ~ **of** ***one's*** **duty** borcunu namusla yerinə yetirmək; 2. hərəkət, iş, fəaliyyət; əmək; **to be modest about** ***one's*** **own ~s** öz əməllərilə öyünmək; **to put up a good** ~ özünü yaxşı aparmaq; 3. tamaşa, teatr tamaşası; **first** ~ premyera *(pyesin teatrda ilk tamaşası)*; **farewell** ~ vida tamaşası; **evening / afternoon** ~ axşam/gündüz tamaşası; *No performance tonight Bu axşam / gün tamaşa yoxdur*; 4. konsert; **musical** ~ musiqi konserti; 5. oynama, ifa etmə *(rolu və s.)*; **best** ~ ən yaxşı ifa; *The play has had a run of one hundred performances Pyes yüz dəfə oynanılıb*; 6. oyun, fokus; *The conjurer's performance kept the children spellbound Sehrbazın oyunu uşaqları ovsunlamışdı*

**performer** [pə'fɔ:mə'] *n* 1. icraçı, icra edən; yerinə yetirən; 2. ifaçı, artist; *He is an admirable performer on the violin O, skripkada əla çalır*

**performing** [pə:'fɔ:mɪŋ] *adj* 1. icra, icraçı; ~ **arts** incəsənətin icra növləri *(teatr, sirk və s.)*; 2. öyrədilmiş, təlim verilmiş *(heyvan haq.)*; ~ **monkeys / dogs / lions / tigers, etc.** təlim verilmiş meymunlar / itlər / şirlər / pələnglər və s.

**perfume**¹ ['pə:fju:m] *n* 1. xoş iy, rayihə; aromat; **the** ~ **of verbena** minaçiçəyinin iyi / rahiyəsi; **the** ~ **of rose** qızılgülün iyi; 2. ətir; **a bottle of** ~ bir şüşə ətir; **to put** ~ ətir vurmaq; **to put** ~ **on a handkerchief** əl dəsmalına / dəsmala ətir vurmaq

**perfume**² ['pə:fju:m] *v* 1. ətir vurmaq, ətirləmək; 2. ətir iyi saçmaq/vermək/ yaymaq; *Roses perfumed the air Qızılgüllər havaya ətir saçırdı*

**perfumed** ['pə:fju:md] *adj* ətirlənmiş, ətir vurulmuş; **a** ~ **handkerchief** ətirlənmiş / ətir vurulmuş dəsmal / yaylıq

**perfumer** [pə'fju:mə'] *n* ətriyyatçı, ətriyyat sənayesi işçisi

**perfumery** [pə'fju:mərɪ] *n* 1. ətriyyat, ətriyyat malları; 2. ətriyyat mağazası; 3. ətriyyat fabriki

**perfunctorily** [pə'fʌŋktərɪlɪ] *adv* etinasızlıqla, saymazyana, etinasız/saymaz bir tərzdə; yüngülcə

**perfunctory** [pə'fʌŋktərɪ] *adj* 1. üzdən; səthi, yüngül; diqqətsiz, etinasız, saymaz; başdansovdu, səliqəsiz; ~ **inspection** səthi / başdansovdu yoxlama; ~ **inquiry** yüngül dindirmə / istintaq; **a** ~ **piece of work** səliqəsiz iş; 2. dayaz *(adam)*; **a** ~ **person** dayaz adam

**perfuse** [pə'fju:z] *v* 1. çiləmək, səpmək, sıçratmaq; sulamaq; **to** ~ **with water** su çiləmək / səpmək; 2. bulamaq, tökmək; **to** ~ **colour** rəng / boya tökmək, boya ilə bulamaq

**perfusion** [pə'fju:ʒn] *n* 1. çiləmə, səpmə; tökmə; batırma; 2. *kils.* çiləmə, səpmə

**perhaps** [pə'hæps] *adv* ola bilsin (ki), olsun ki; *Perhaps she's ill Ola bilsin ki, o, xəstədir; Perhaps the weather will change tomorrow Ola bilsin ki, hava sabah dəyişsin*

**per head** [pə'hed] *adv* adambaşına; hər biri; *How much beer will they drink per head? Adambaşına onlar nə qədər pivə içəcəklər?*

**peril** ['perɪl] *n* təhlükə, risk, xətər, xata; **the** ~ **of nuclear war** nüvə müharibəsi təhlükəsi; **in** ~ **of** risk edərək; **in** ~ **of** ***one's*** **life** həyatı ilə risk edərək; **to rush / to thrust oneself into** ~ risk etmək, özünü təhlükəyə atmaq

**perilous** ['perɪləs] *adj* təhlükəli, qorxulu, xətərli, xatalı; **a** ~ **journey** təhlükəli səyahət; ~ **ascent** təhlükəli yoxuş

**perilously** ['perɪləslɪ] *adv* təhlükəli, qorxulu, təhlükəli / qorxulu surətdə

**perilousness** [ˈperɪləsnɪs] *n* təhlükə, qorxu, xata, xətər, risk
**perimeter** [pəˈrɪmɪtəʳ] *n* **1.** *riyaz.* perimetr *(müstəvi həndəsi fiqurun bütün tərəflərinin uzunluğunun cəmi)*; **2.** istehkamın və ya düşərgənin xarici sərhədi / hüdudu
**period** [ˈpɪərɪəd] *n* **1.** dövr, müddət, vaxt; zaman müddəti; **lasting for a ~ of three months** üç ay davam edən dövr; **fixed ~** müəyyənləşdirilmiş müddət / vaxt; **at this ~ of the year** ilin bu vaxtında; **~ of rest** istirahət müddəti; **trial ~** sınaq dövrü; **extra / overtime ~** *id.* əlavə vaxt; **2.** mərhələ; **~s of a disease** xəstəliyin mərhələləri; **3.** dərs; **a history ~** tarix dərsi; **4.** *qram.* mürəkkəb cümlə; **5.** nöqtə; cümlənin sonunda fasilə
**periodic** [ˌpɪərɪˈɔdɪk] *adj* **1.** dövri; **~ system** dövri sistem *(kimyəvi elementlərin)*; **2.** ritorik, yüksək *(üslub haq.)*
**periodical**[1] [ˌpɪərɪˈɔdɪkl] *n* dövri nəşr, jurnal; **monthly ~** aylıq / ayda bir dəfə çıxan jurnal
**periodical**[2] [ˌpɪərɪˈɔdɪkl] *adj* = **periodic**
**periodically** [ˌpɪərɪˈɔdɪkəlɪ] *adv* hərdənbir, bəzən, vaxtaşırı
**peripatetic** [ˌperɪpəˈtetɪk] *adj* səyyah, səyahət edən, gəzən, səyyar, avara, sərsəri, bir yerdə qərar tutmayan; **~ music teacher** səyyar musiqi müəllimi
**peripherial** [pəˈrɪfərəl] *adj* **1.** periferiya; **~ zones** periferiya zonaları; **2.** ikinci dərəcəli əhəmiyyəti olan, az əhəmiyyətli; **matters of ~ interest** ikinci dərəcəli maraq kəsb edən məsələlər
**periphery** [pəˈrɪfərɪ] *n* **1.** kontur *(çevrə)*; **2.** periferiya, əyalət, rayon, ətraf *(mərkəzdən uzaq yerlər)*; **industrial development on the northern ~ of the town** şəhərin şimal periferiyasında sənayenin inkişafı
**periphrase**[1] [ˈperɪfreɪz] *n* = **periphrasis**
**periphrase**[2] [ˈperɪfreɪz] *v* başqa sözlə ifadə etmək
**periphrases** [pəˈrɪfrəsiːz] *n* **periphrasis** *isminin cəm forması*
**periphrasis** [pəˈrɪfrəsɪs] *n (pl* **-ses***)* parafraz *(bir ifadə və ya sözün mənasının təsvir vasitəsilə verilməsi)*
**periphrastic** [ˌperɪˈfræstɪk] *adj* **1.** təsviri, təsvir vasitəsilə deyilən; çoxlu parafraz olan *(nitq və s.)*; **2.** *qram.* təsviri; **~ conjugation** təsviri dəyişmə / təsrif *(feldə)*
**periphrastically** [ˌperɪˈfræstɪkəlɪ] *adv* təsviri surətdə, təsvir yolu ilə / vasitəsilə
**perish** [ˈperɪʃ] *v* **1.** ölmək, məhv olmaq; **to ~ with hunger / with thirst** acından / susuzluqdan ölmək; **to ~ from cold / from heat** soyuqdan / istidən ölmək / məhv olmaq; *I am perishing with cold! Mən soyuqdan ölürəm; Thousands of people perished in the earthquake Zəlzələdə minlərlə adam öldü / məhv oldu*; **2.** yox / qeyb olmaq; həmişəlik yox / qeyb olmaq; *The seal on the bottle has perished Butulkanın üstündəki möhür silinib / yox olub*

**perishable** [ˈperɪʃəbl] *adj* **1.** *(xüs. ərzaq haq.)* tez xarab olan / korlanan / çürüyən; **~ goods** tez xarab olan mallar; **~ fruits / vegetables** tez xarab olan / çürüyən meyvələr / tərəvəzlər; **2.** müvəqqəti, keçici, fani; davamsız, tezdağılan; **~ material** tezdağılan / davamsız material
**perishables** [ˈperɪʃəblz] *n pl* tez xarab olan / çürüyən mallar; *Fish and flowers are perishables Balıq və gül tez xarab olan mallardır*
**perished** [ˈperɪʃt] *adj* = **perishing**
**perishing** [ˈperɪʃɪŋ] *adj* **1.** bərk, çox; **~ cold** bərk / çox soyuq; *It's really perishing cold this morning Bu sabah həqiqətən çox / bərk soyuqdur*; **2.** bərk soyuq hiss edən; *I'm perishing / perished with cold, let's get indoors Mən burada soyuqdan ölürəm, gəl / gəlin içəri gedək*
**peritonitis** [ˌperɪtəˈnaɪtɪs] *n tib.* peritonit *(qarın pərdəsinin iltihabı)*
**perjure** [ˈpəːdʒəʳ] *v* **1.**: **to ~ oneself** *hüq.* yalan danışmaq / söyləmək / demək *(xüs. məhkəmədə and içdikdən sonra)*; *Several witnesses perjured themselves in order to protect the accused Müttəhimi müdafiə etmək üçün şahidlərin bir çoxu yalan danışdılar*; **2.** *hüq.* andı pozmaq
**perjurer** [ˈpəːdʒərəʳ] *n* yalançı şahid
**perjury** [ˈpəːdʒərɪ] *n* **1.** yalançı şahidlik, yalan şəhadət *(xüs. and içdikdən sonra)*; **to commit ~** and içdikdən sonra yalan şəhadət vermək; **2.** xainlik, vəfasızlıq, xəyanət, andı pozma
**perk**[1] [pəːk] *n* **1.** qanuna görə sahibkardan alınan pul və ya mal; pay; *Perks offered by the firm include a car Firmanın təklif etdiyi paya bir minik maşını daxildir*; **2.** işçinin malik olduğu imtiyaz; *One of the perks of this job is that you don't have to work on Saturday Bu işin imtiyazlarından biri ondan ibarətdir ki, sən / siz şənbə günü işləmirsən / işləmirsiniz*
**perk**[2] [pəːk] *v* **1.** **(up)** qaldırmaq *(başını)*; uzatmaq *(boynunu)*; *The horse perked up its head At başını qaldırdı*; **to ~ up one's ears** qulaqlarını qaldırmaq / şəkləmək *(heyvan haq.)*; **2.** *d.d.* **(up)** canlanmaq, cana gəlmək; ruhlanmaq, ayılmaq, şövqə gəlmək, kefi açılmaq; *He felt depressed but soon perked up when his friends arrived O, dilxor idi, lakin dostları gəldikdən sonra tezliklə kefi açıldı*
**perkily** [ˈpəːkɪlɪ] *adv* diribaşlıqla, zirəkliklə, şən / şad bir tərzdə
**perkiness** [ˈpəːkɪnɪs] *n* diribaşlıq, zirəklik, şənlik, şadlıq
**perky** [ˈpəːkɪ] *adj (müq. dərəcəsi*: **-ier**, *üst. dərəcəsi*: **-iest***)* şad, şən, şux, sevincli; zirək, cəld, diribaş; *He's still in bed, but he seems quite perky O, hələ yataqdadır (yəni xəstədir), lakin o çox şən / şad görünür*
**perm**[1] [pəːm] *n* **1.** **permanent wave** *sözbirləşməsinin qısa forması*; **2.** *d.d.* davamlı saç düzümü; **to have a ~** saçını davamlı düzdürmək



**perm**[2] [pəːm] *v* saçını davamlı düzdürmək; *Her hair has been permed Onun saçı davamlı düzülüb*
**permafrost** [ˈpəːməfrɔst] *n* torpağın əbədi olaraq donuşluğu
**permanence** [ˈpəːmənəns] *n* dəyişməzlik, sədaqət, sarsılmazlıq, möhkəmlik, davamlılıq; daimilik; **~ of feelings** hissin dəyişməzliyi / daimiliyi; **~ of a treaty** müqavilənin möhkəmliyi / davamlılığı
**permanency** [ˈpəːmənənsɪ] *n* **1.** = **permanence**; **2.** daimi iş / təşkilat; **a temporary job, not a ~** müvəqqəti məşğuliyyət, lakin daimi iş yox; **to give smb. a ~** bir kəsə daimi iş vermək
**permanent** [ˈpəːmənənt] *adj* **1.** daimi, həmişəlik; arası kəsilməyən, arasıkəsilməz, uzunmüddətli; möhkəm; davamlı; **the ~ members of the UN Security Council** BMT-nin Təhlükəsizlik Şurasının daimi üzvləri; **~ colour** möhkəm / davamlı boya; **a ~ feature** dəyişməz / daimi xüsusiyyət; **a ~ exhibition** daimi sərgi; **2.** uzunmüddətli; **~ defence** uzunmüddətli müdafiə
**permanently** [ˈpəːmənəntlɪ] *adv* həmişəlik, əbədi olaraq; **to be ~ disabled** həmişəlik əlil olmaq; *She is now based permanently in the USA İndi o, əbədi/həmişəlik olaraq ABŞ-da məskən salıb*
**permeable** [ˈpəːmɪəbl] *adj* süzən, keçirən; **~ soils** keçirən / süzən torpaqlar
**permeate** [ˈpəːmɪeɪt] *v* **1.** daxil olmaq, keçmək; *Water permeates everywhere Su hər yerə keçir*; **2.** hopdurmaq, canına çəkdirmək; *The soil was permeated with water Torpaq suyu canına çəkdi*; **3.** yayılmaq; **ideas that have ~d among / into / through the people** xalq arasında yayılmış fikirlər / ideyalar
**permeation** [ˌpəːmɪˈeɪʃn] *n* keçmə, süzülmə; **the ~ of water from the surface** suyun yerin səthindən süzülməsi / keçməsi
**permissible** [pəˈmɪsəbl] *adj* yol/icazə verilə bilən, mümkün olan; **~ levels of nitrates in water** suda nitrat duzunun yol verilə bilən səviyyələri; *Such conduct is permissible Belə davranışa/hərəkətə yol verilə bilər*
**permission** [pəˈmɪʃn] *n* icazə, izin, müsaidə, rüsxət; **to give smb. ~ to do smth.** bir şey etmək üçün bir kəsə icazə / izin vermək; **with your ~** sizin icazənizlə; *She asked (for) permission to leave early Tez getmək üçün o, icazə istədi*; **to obtain the necessary ~** lazımi icazə almaq
**permissive** [pəˈmɪsɪv] *adj* **1.** qanuni, yol verilən, icazə / izn verən; **2.** mərhəmətli, iltifatlı, yumşaq, dözümlü; **~ parents** iltifatlı / yumşaq valideynlər; **~ attitudes** iltifatlı/yumşaq münasibətlər
**permissively** [pəˈmɪsɪvlɪ] *adv* mərhəmətlə, iltifatla
**permissiveness** [pəˈmɪsɪvnɪs] *n* iltifatlılıq, yumşaqlıq, mərhəmətlilik

**permit**[1] [pəˈmɪt] *n* **1.** icazə *(rəsmi)*; **export ~** eksport üçün icazə; **official ~** rəsmi icazə; *Nobody can enter a military base without a permit İcazəsi olmadan hərbi bazaya heç kəs girə bilməz*; **2.** lisenziya, icazə şəhadətnaməsi/vəsiqəsi; **3.** icazənamə, icazə vərəqəsi; **to take out a ~** icazə vərəqəsi almaq
**permit**[2] [pəˈmɪt] *v* **(-tt-)** **1.** icazə/izn/rüsxət vermək; *Smoking is not permitted here Burada papiros / siqaret çəkməyə icazə verilmir*; **2.** yol / imkan vermək; *I cannot permit such cruelty Mən belə qəddarlığa yol verə bilmərəm; Weather permitting, we'll go tomorrow Hava imkan versə, biz sabah gedəcəyik; The situation does not permit of any delay Vəziyyət heç bir təxirə yol vermir*
**pernicious** [pəˈnɪʃəs] *adj* zərərli, ziyanlı, xətərli, xatalı; **~ principles** çox zərərli prinsiplər; **~ habits** zərərli/ziyanlı/xətərli adətlər; **~ influence on society** cəmiyyətə zərərli / xatalı təsir
**perniciously** [pəˈnɪʃəslɪ] *adv* zərərli, ziyanlı, xətərli, çox pis, çox zərərli
**perniciousness** [pəˈnɪʃəsnɪs] *n* zərərlilik, ziyanlılıq, xətərlilik
**pernickety** [pəˈnɪkətɪ] *adj d.d.* bəhanə axtaran, hər şeyə irad tutan, bəhanəçi, iradcıl, tələbkar; şıltaq, vasvası; **~ about one's food** yeməyində vasvası / tələbkar
**perorate** [ˈperəreɪt] *n* **1.** boşboğazlıq/ naqqallıq etmək; *He would perorate for hours O, saatlarla boşboğazlıq / naqqallıq edərdi*; **2.** ifadəli oxumaq *(bədii əsəri)*; təmtəraqla söyləmək; **3.** xülasə etmək, yekun vurmaq, yekunlaşdırmaq
**peroration** [ˌperəˈreɪʃn] *n* nəticə, xülasə *(nitq haq.)*
**peroxide** [pəˈrɔksaɪd] *n kim.* peroksid
**perpendicular**[1] [ˌpəːpənˈdɪkjələʳ] *n* **1.** *riyaz.* perpendikulyar, perpendikulyar xətt; **to draw a ~ to a line** xəttə perpendikulyar çəkmək; **2.** vertikal; şaquli / dik vəziyyət
**perpendicular**[2] [ˌpəːpənˈdɪkjələʳ] *adj* **1.** perpendikulyar; **a ~ line** perpendikulyar xətt; **2.** vertikal, şaquli, dik; **~ staircase** dik pilləkən; **~ cliffs** dik qayalar; **3.** düz, qaməti əyilməmiş; **a stiff ~ old lady** zabitəli, düz qamətli qoca xanım
**perpendicularity** [ˌpəːpənˌdɪkjuˈlærɪtɪ] *n riyaz.* perpendikulyarlıq
**perpendicularly** [ˌpəːpənˈdɪkjuləlɪ] *adv* perpendikulyar olaraq, dik/şaquli vəziyyətdə
**perpetrate** [ˈpəːpətreɪt] *v* **1.** etmək, eləmək; **to ~ a crime / an error** cinayət / səhv etmək; *Who perpetrated the crime? Bu cinayəti kim edib?*; **2.** *zaraf.* yaratmaq, vücuda gətirmək; **to ~ a pun / a verse** cinas / şer quraşdırmaq / qondarmaq
**perpetration** [ˌpəːpɪˈtreɪʃn] *n* **1.** cinayət etmə; cinayət; **2.** *zaraf.* yaratma, vücuda gətirmə
**perpetrator** [ˈpəːpɪtreɪtəʳ] *n* cinayətkar; günahkar
**perpetual** [pəˈpetjuəl] *adj* **1.** əbədi; daimi; ~

**motion** əbədi / daimi hərəkət; **the ~ snows of the mountaintops** dağ zirvələrinin əbədi qarları; 2. arasıkəsilməz, sonsuz; dayanmadan; aramsız; **the ~ noise of the machines** maşınların aramsız /arasıkəsilməz səsi; 3. tez-tez baş verən / təkrar olunan; **~ complaints** tez-tez təkrar olunan şikayətlər; *I'm tired of her perpetual complaints Mən onun tez-tez təkrar olunan şikayətlərindən təngə gəlmişəm*; 4. ömürlük; müddətsiz; **~ imprisonment** ömürlük həbs

**perpetuance** [pə'petjuəns] *n* = **perpetration**

**perpetuate** [pə'petʃueɪt] *v* əbədiləşdirmək; **to ~ *one's* name** öz adını əbədiləşdirmək

**perpetuation** [pə,petʃu'eɪʃn] *n* əbədiləşdirmə; həmişə saxlama; **to ensure ~** əbədiyyəti təmin etmək

**perpetuity** [,pə:pə'tju:ətɪ] *n* əbədiyyət, əbədilik, daimilik; sonsuzluq, hüdudsuzluq; **in / to / for ~** əbədi / daimi / həmişəlik / ömürlük olaraq; *The land was given to them in perpetuity Torpaq onlara əbədi / ömürlük / həmişəlik olaraq verildi*

**perplex** [pə'pleks] *v* 1. çaşdırmaq, karıxdırmaq, çətinliyə salmaq; **to ~ a person** bir kəsi çətin vəziyyətə salmaq, bir kəsi çaşdırmaq; 2. mürəkkəbləşdirmək, çətinləşdirmək, çəlpəşiyə/dolaşığa salmaq, qarışdırmaq; **to ~ an issue** məsələni çətinləşdirmək / dolaşdırmaq /mürəkkəbləşdirmək/ anlaşılmaz etmək; *The translator perplexed the passage Tərcüməçi bu hissəni dolaşıq tərcümə etmişdi*

**perplexed** [pə'plekst] *adj* 1. çaşqın, çətin vəziyyətə düşmüş, çaşdırılmış, karıxdırılmış; karıxmış, özünü itirmiş; **to feel / to be ~** çətin vəziyyətə düşmək; *The audience looked perplexed Tamaşaçılar /Dinləyicilər çaşqın görünürdülər*; 2. dolaşıq, qarışıq, çətin, çəlpəşik; **~ question** dolaşıq / qarışıq məsələ

**perplexedly** [pə'pleksɪdlɪ] *adv* anlaşılmaz / dolaşıq / qarışıq bir tərzdə, özünü itirmiş / karıxmış halda; *He looked perplexedly at everybody O, karıxmış halda hər bir adama baxdı*

**perplexing** [pə'pleksɪŋ] *adj* çaşdıran, karıxdıran, dolaşdıran, çətin vəziyyətə salan; **~ questions** çətin vəziyyətə salan / çaşdıran məsələlər, çətin məsələlər

**perplexity** [pə'pleksɪtɪ] *n* 1. çaşıb qalma, qarıxma, çaşma, çaşqınlıq, özünü itirmə, sıxılma; **to be in ~** çaşıb qalmaq, çaşqınlıq içində olmaq; 2. çətinlik, çətin / ağır vəziyyət; 3. dolaşıqlıq, qarışıqlıq

**perquisite** ['pə:kwɪzɪt] *n* 1. əlavə qazanc, təsadüfi və ya əlavə gəlir; **salaries and ~s** əmək haqqı və əlavə gəlir; 2. çaypulu, bəxşiş; *They paid the waiter a shilling as his perquisite Onlar xörək paylayana bir şillinq çaypulu verdilər*; 3. imtiyaz, üstünlük; səlahiyyət

**pers** [pə:s] *n* **person** *isminin qısa forması*

**persecute** ['pə:sɪkju:t] *v* 1. təqib etmək; izləmək, dalınca düşmək; incitmək, əziyyət vermək, gözümçıxdıya salmaq; **to ~ progressive leaders** mütərəqqi fikirli rəhbərləri təqib etmək; 2. cana / təngə gətirmək, usandırmaq, bezar etmək, bezdirmək; **to ~ *smb.* with requests** xahişlərlə/yalvarışlarla bir kəsin zəhləsini aparmaq/tökmək; *He persecuted us with questions O, suallarla bizi təngə gətirdi*

**persecution** [,pə:sɪ'kju:ʃn] *n* 1. təqib, təqib etmə, incitmə; **to suffer cruel ~s** amansız təqibdən əziyyət çəkmək; **the ~ of communists under nazism** faşizm hakimiyyəti dövründə kommunistlərin təqib edilməsi; 2. təngə/cana gətirmə, bezdirmə, bezar etmə; əl çəkməmə; **the ~ of flies and gnats** milçəklərin və ağcaqanadların zəhlə tökməsi

**persecutor** ['pə:sɪkju:təʳ] *n* təqibçi, təqib edən /qəddar adam; incidən/əziyyət verən/ gözümçıxdıya salan adam

**perseverance** [,pə:sɪ'vɪərəns] *n* inad, səbat, mətanət, qətiyyətlilik; **to show great ~ in the face of extreme hardship** çox böyük çətinlik qarşısında mətanət göstərmək

**persevere** [,pə:sɪ'vɪəʳ] *v* **(at, in, with)** qətiyyətlə / inadla / inadkarlıqla davam etdirmək, inadkarlıq/qətiyyət göstərmək; **to ~ in *one's* studies** təhsilini inadkarlıqla davam etdirmək; **to ~ in / with *one's* work** işini qətiyyətlə/ inadkarlıqla davam etdirmək

**persevering** [,pə:sɪ'vɪərɪŋ] *adj* mətanətli, inadlı, inadcıl, qətiyyətli; *A few persevering climbers finally reached the top of the mountain Nəhayət bir neçə inadkar/mətanətli alpinist dağın təpəsinə çatdı*

**Persian**[1] ['pə:ʃn] *n* 1. fars; **the ~s** *top.i* farslar; 2. fars dili

**Persian**[2] ['pə:ʃn] *adj* fars; İran; **the ~ language** fars dili; **~ carpet** İran xalçası

**persimmon** [pə'sɪmən] *n bot.* 1. xırnik / korolyok ağacı; 2. xırnik, korolyok *(meyvə)*

**persist** [pə'sɪst] *v* 1. inad / səbat / mətanət göstərmək, sözündən/işindən dönməmək; *He persisted in working at his experiment O, eksperimenti üzərində inadla işlədi*; **to ~ in *one's* opinion** öz fikri üzərində möhkəm dayanmaq; *If you persist in breaking the law, you will go to prison Əgər sən / siz qanunu pozmağı davam etdirsən, / etdirsəniz, həbsxanaya düşəcəksən / düşəcəksiniz*; 2. davam etmək, dəyişməmək; *The bad weather will persist all over the country Pis hava bütün ölkədə davam edəcək*

**persistence** [pə'sɪstəns] *n* 1. inad, səbat, mətanət; inadcıllıq; *Persistence and courage are wonderful qualities Mətanət və cəsarət yaxşı keyfiyyətlərdir*; 2. davamlılıq, möhkəmlik, dözümlülük; 3. davam etmə; *The doctor couldn't explain the persistence of the high temperature Həkim yüksək qızdırmanın / temperaturun davam etməsini izah edə bilmədi*



**persistent** [pə'sɪstənt] *adj* 1. inad, inadlı, inadcıl; sabit; sarsılmaz, davamlı; **a ~ theif** inadcıl oğru; **to be ~ in *one's* intentions** öz məramında inadcıl / inadlı olmaq; 2. möhkəm, davamlı, arası kəsilməyən; **~ rain** ardı-arası kəsilməyən yağış; **~ demand** daimi tələb/tələbat; 3. düşməyən, qopmayan *(yarpaq haq.)*

**person** ['pə:sn] *n* 1. *(pl* **people** *və ya* **persons)** adam; şəxs; şəxsiyyət; subyekt; *Who is that person? O adam kimdir?; He is just the person we need for the job O əsl bizim işimizə yarayan adamdır; I noticed that there were two or three persons there Mən gördüm ki, orada iki, yaxud üç adam var*; 2. görkəm, xarici görkəm; **a young woman of an agreeable ~** xoş görkəmli gənc qadın; **to have a commanding ~** nüfuzlu/rəhmli görkəmə malik olmaq; 3. iştirak edən şəxs, personaj *(dramatik və ya ədəbi əsərdə iştirak edən şəxs)*; **in the ~ of Vagif** Vaqif rolunda; *He was wonderful in the person of Vagif Vaqif rolunda o, əla çıxış etdi*; 4. *hüq.* fiziki şəxs; **juridical ~** yuridik/hüquqi şəxs; 5. *qram.* şəxs; **the second ~ plural** ikinci şəxs cəm; **the first ~ singular** birinci şəxs tək

**persona** [pə:'sounə] *n lat.* şəxs, zat, şəxsiyyət; **~ grata** *dip.* toxunulmaz şəxs; **~ non grata** *dip.* arzuolunmaz şəxs

**personable** ['pə:sənəbl] *adj* gözəl, qəşəng, yaxşı xarici görkəmi olan, görkəmli, vüqarlı; *He is a personable man O, görkəmli kişidir*

**personage** ['pə:sɪnɪdʒ] *n* 1. məşhur/görkəmli şəxsiyyət; 2. xüsusi / seçilmiş adam; **helpful ~** faydalı/yararlı/köməyəgələn adam; 3. personaj, iştirak edən adam; **the most interesting ~ in this story** bu povestdə ən maraqlı personaj; **a play with only three ~s** üç iştirakçısı olan *(aktyorun oynadığı)* pyes; **to represent the ~ of *smb.*** bir kəsin rolunu oynamaq *(həm də məc.)*

**personal** ['pə:snl] *adj* 1. şəxsi; **~ opinion** şəxsi fikir/rəy; **~ needs** şəxsi ehtiyac; **~ weapon** şəxsi silah; **~ rights** şəxsi hüquqlar; **charm** şəxsi məlahət / cazibə; **~ beauty** şəxsi gözəllik; **to make a ~ application** şəxsən özü müraciət etmək; 2. daşınar; **~ property** daşınar əmlak; 3. *qram.* şəxs; **~ pronouns** şəxs əvəzlikləri

**personality** [,pə:sə'nælɪtɪ] *n* 1. şəxsiyyət; **strong ~** güclü şəxsiyyət; 2. tanınmış / məşhur şəxsiyyət; xadim

**personalization, -sation** [,pə:snəlaɪ'zeɪʃn] *n* mücəssəmə; canlandırma, şəxsləndirmə

**personalize, -ise** ['pə:snəlaɪz] *v* göstərmək, ifadə etmək; təmsil etmək, təcəssüm etdirmək, şəxsləndirmək, canlandırmaq

**personally** ['pə:snəlɪ] *adv* şəxsən, özü; *All letters will be answered personally Bütün məktublara şəxsən cavab veriləcək; I don't know him personally Mən onu şəxsən tanımıram; Personally, I don't recognize him at all Şəxsən mən onu əsla / qətiyyən tanımıram*

**personification** [pə:,sɔnɪfɪ'keɪʃn] *n* şəxsləndirmə; təcəssüm etdirmə, ifadə / təmsil etmə, canlandırma

**personify** [pə:'sɔnɪfaɪ] *v (pt, pp* **-fied)** təcəssüm etdirmək, təmsil / ifadə etmək, canlandırmaq, şəxsləndirmək; *Poets personify the sun and the moon Şairlər günəşi və ayı canlandırırlar/ şəxsləndirirlər*

**personnel** [,pə:sə'nel] *n* 1. personal, heyət; kadrlar; **the ~ of the hospital** xəstəxananın personalı / heyəti; **to increase ~** personalı artırmaq; 2. *hərb.* şəxsi heyət

**perspective**[1] [pə'spektɪv] *n* 1. görünüş, perspektiv *(mənzərənin uzaqdan görünüşü)*; **picture out of ~** perspektivi korlanmış şəkil; 2. mənzərə; *A fine perspective opened before his eyes Onun gözləri qarşısında gözəl bir mənzərə açıldı*; 3. fikir, məqsəd, niyyət, plan; **in ~** gələcəkdə, perspektivdə; *We have a long perspective of happy days before us Bizim gələcəkdə uzun xoşbəxt günlərimiz var*

**perspective**[2] [pə'spektɪv] *adj* 1. *rəs.* perspektiv; 2. gələcəyi / perspektivi olan; 3. tərsimi; **~ geometry** tərsimi həndəsə

**perspicacious** [,pə:spɪ'keɪʃəs] *adj* çox ağıllı, fərasətli, bəsarətli, gözüaçıq, açıqgözlü

**perspicaciously** [,pə:spɪ'keɪʃəslɪ] *adv* ağılla, fərasətlə, açıqgözlüklə, açıqgözlüklə

**perspicacity** [,pə:spɪ'kæsɪtɪ] *n* iti zəka/ağıl, fərasət, bəsarət, ağıllılıq, fərasətlilik, gözüaçıqlıq, açıqgözlülülk; **to show ~ in selecting assistants** köməkçilər seçməkdə fərasət / ağıllılıq göstərmək

**perspicuity** [,pə:spɪ'kju:ɪtɪ] *n* aydınlıq, açıqlıq *(nitq və s. haq.)*

**perspicuous** [pə'spɪkjuəs] *adj* aydın, açıq; *The reason is perspicuous Səbəb aydındır*

**perspirable** [pə'spaɪərəbl] *adj* tərləyən, tərli

**perspiration** [,pə:spə'reɪʃn] *n* 1. tərləmə; 2. tər; *The perspiration stands on his forehead Onun alnında tər əmələ gəlib; The perspiration cools the skin in hot weather İsti havada tər dərini sərinləşdirir*; **beads of ~** tər damlaları; **streaming with ~** tərləmiş, tərdən islanmış

**perspiratory** [pə'spaɪərətərɪ] *adj* tər əmələ gətirən, tərlədən, tər; **~ gland** tər vəzi; *The heat was perspiratory İsti tərlədirdi*

**perspire** [pə'spaɪəʳ] *v* tərləmək; *My feet don't perspire Mənim ayaqlarım tərləmir*

**persuade** [pə'sweɪd] *v* inandırmaq; sübut etmək; tovlamaq; **to ~ *smb.* of *smth.*** bir kəsi bir şeyə inandırmaq; *He persuaded me that it was true O məni inandırdı ki, o, həqiqətdir/düzdür; I am persuaded of his honesty Mən onun düzlüyünə səmimiyyətinə/ sədaqətinə inanıram*; **to be ~d of *smth.*** bir şeyə əmin olmaq; *I am persuaded that it is true Mən əminəm ki, bu doğrudur/həqiqətdir*; **to be ~** inanmaq

**persuasion** [pə'sweɪʒn] *n* **1.** inandırma; razı salma; **by force or ~** güclə və ya inandırma yolu ilə; *Gentle persuasion is more effective than force Nəzakətlə inandırma gücdən təsirlidir*; **2.** inam, fikir; *It's my persuasion that he is right Mən əminəm ki, o, haqlıdır; It's my private persuasion Bu mənim şəxsi fikrimdir / inamımdır*; **3.** əminlik, əmin olma, yəqinlik; **full ~** tam əminlik; **4.** dini etiqad; *They are of the same persuasion Onlar eyni etiqada mənsubdurlar, Onların etiqadı eynidir*; **people of many different religious ~s** çox müxtəlif dini əqidəli adamlar

**persuasive** [pə'sweɪsɪv] *adj* inandırıcı; **~ speech/reasons** inandırıcı nitq / səbəblər

**persuasiveness** [pə'sweɪsɪvnɪs] *n* əminlik, əmin olma, yəqinlik, möhkəm etiqad, qəti inam; inandırıcılıq; **the ~ of his arguments** onun dəlillərinin inandırıcılığı / qətiliyi

**persuasively** [pə'sweɪsɪvlɪ] *adv* inamla, qəti olaraq, inandırıcı bir tərzdə / surətdə

**pert** [pə:t] *adj* **1.** ədəbsiz, həyasız, utanmaz, qaba, kobud; sözqaytaran, diliuzun *(xüs. qız və qadınlar haq.)*; **~ answer** ədəbsiz / qaba / kobud cavab; **2.** tər, təzə; çiçəklənən *(bitki haq.)*; *The leaves are pert and green Yarpaqlar tər və yaşıldır*

**pertain** [pə'teɪn] *v* **1.** aid / dəxli olmaq *(bir şeyə)*; *This does not pertain to my office Bu mənim səlahiyyətimə aid deyil*; **2.** yaramaq, münasib / uyğun olmaq; *It doesn't pertain to a gentleman Bu, centlmenə yaraşmır*

**pertinacious** [ˌpə:tɪ'neɪʃəs] *adj* tərs, inad, inadcıl, kəc; güzəştə / yola getməyən

**pertinaciously** [ˌpə:tɪ'neɪʃəslɪ] *adv* tərsliklə, inadla, tərs-tərs

**pertinaciousness** [ˌpə:tɪ'neɪʃəsnɪs] *n* tərslik, inadcıllıq; güzəştə getməmə, inad göstərmə

**pertinacity** [ˌpə:tɪ'næsɪtɪ] *n* tərslik, inadcıllıq, kəclik, inadkarlıq, güzəştə getməmə

**pertinence** ['pə:tɪnəns] *n* münasiblik, uyğunluq, yerinə düşmə; **the ~ of his remark** onun iradının münasibliyi / yerinə düşməsi;

◊ *It's of no pertinence to us Bunun bizə dəxli yoxdur*

**pertinency** ['pə:tɪnənsɪ] *n* = **pertinence**

**pertinent** ['pə:tɪnənt] *adj* yerində, uyğun, münasib, yaraşan, uyğun gələn, yararlı; işə dəxli olan; **~ remark** yerli / münasib irad; **to say** *smth.* **~** münasib/müvafiq bir şey demək; **books ~ to the question** məsələyə dəxli olan kitablar; **questions ~ to the matter in hand** gündəlikdə olan işə aid məsələlər

**perturb** [pə'tə:b] *v* pərt etmək, utandırmaq; həyəcana / təşvişə salmaq; rahatsız / narahat etmək; **to ~ the pacific order of the country** ölkədə sakitliyi və asayişi pozmaq

**perturbation** [ˌpətə'beɪʃn] *n* **1.** həyacan, vəlvələ, çaxnaşma, təşviş, narahatlıq; **to show no ~** həyəcanlanmamaq, təşviş keçirməmək; **2.** qarışıqlıq, nizamsızlıq, iğtişaş; **3.** *astr.* sarsıntı

**perturbed** [pə'tə:bd] *adj* həyəcanlı, narahat; **a ~ young man** narahat / həyəcanlı gənc oğlan

**perusal** [pə'ru:zl] *n* diqqətlə oxuma

**peruse** [pə'ru:z] *v* **1.** diqqətlə / müfəssəl tərzdə oxumaq; **to ~ a document** sənədi ətraflı və diqqətlə oxumaq; **to ~ a book** kitabı əvvəldən axıra kimi diqqətlə oxumaq; **2.** fikirləşmək, düşünmək; götür-qoy etmək

**pervade** [pə'veɪd] *v* yayılmaq; nüfuz etmək; hopdurmaq, hopmaq; doldurmaq; *The smell of flowers pervaded the house Çiçəklərin ətri/rayihəsi evi doldurmuşdu*

**pervasive** [pə'veɪsɪv] *adj* yayılan, nüfuz edən; daxil olan; **~ perfume** yayılan ətir / rayihə; **a ~ smell of damp** yayılan nəm iyi

**perverse** [pə'və:s] *adj* **1.** qüsurlu, nöqsanlı, eyibli; səhv, yanlış; təhrif edilmiş, qeyri-adi; **a ~ decision** səhv / yanlış qərar; **2.** tərs, inad, inadcıl; **a ~ child** inadcıl / tərs uşaq; **3.** şıltaq; **a ~ woman** şıltaq qadın

**perversely** [pə'və:slɪ] *adv* təhrif olmuş / pozulmuş / korlanmış tərzdə

**perversion** [pə'və:ʃn] *n* **1.** təhrif etmə, pozma; səhv; **~ of the truth** həqiqəti təhrif etmə; **~ of history** tarixi təhrif etmə; **~ of spelling** imla səhvi; **~ of justice** ədaləti pozma; **2.** pozma, qaydadan kənara çıxma; pozulma; **~ of the organs of digestion** həzm orqanlarının pozulması; **sexual ~** cinsi əlaqədə qeyri-təbiilik / pozğunluq

**perversity** [pə'və:sɪtɪ] *n* **1.** pozğunluq, qüsurluluq, nöqsanlılıq; əxlaqsızlıq, tərbiyəsizlik; **~ of Roman morals** Roma adətlərinin qüsuru / nöqsanı; **2.** tərslik, inad, inadkarlıq, kəclik, şıltaqlıq

**pervert**[1] ['pə:və:t] *n* **1.** pozğun adam; **2.** dönük, xain, mürtəd

**pervert**[2] ['pə:və:t] *v* **1.** təhrif etmək, saxtalaşdırmaq, mənasını korlamaq / pozmaq; düz izah etməmək; *He has perverted the meaning of my article O mənim məqaləmin mənasını təhrif edib; The symmetry was perverted Simmetriya pozuldu*; **2.** yoldan / başdan çıxartmaq, azdırmaq, tovlamaq, pozmaq, pis yola çəkmək

**perverted** [pə'və:tɪd] *adj* **1.** təhrif edilmiş, saxtalaşdırılmış, korlanmış; **the ~ age** korlanmış əsr; **~ intellect** korlanmış ağıl; **2.** pozğun, cinsi əlaqəyə mübtəla olmuş

**peseta** [pə'setə] *n* pezet *(İspaniyada pul vahidi)*

**pesky** ['peskɪ] *adj amer.* **1.** zəhlətökən, təngəgətirən, bezikdirici, usandırıcı; **~ mosquitoes** zəhlətökən / bezikdirici ağcaqanadlar; **2.** pis, iyrənc, mənfur; bərbad, yaman; **~ room** iyrənc / pis otaq; *What pesky weather! Nə iyrənc havadır!*

**peso** ['peɪsou] *n* *(pl* **-os** [-ouz]*)* **1.** peso *(Latın Amerikasında pul vahidi)*; **2.** *amer. d.d.* dollar

**pessimism** ['pesɪmɪzm] *n* pessimizm, bədbinlik

**pessimist** ['pesɪmɪst] *n* pessimist



**pessimistic** [ˌpesɪ'mɪstɪk] *adj* pessimist; bədbin; **to be ~ about the future** gələcək barədə bədbin / pessimist olmaq

**pessimistical** [ˌpesɪ'mɪstɪkəl] *adj* = **pessimistic**

**pessimistically** [ˌpesɪ'mɪstɪkəlɪ] *adv* bədbincəsinə, bədbin bir tərzdə

**pest** [pest] *n* **1.** ziyanverici həşərat, kənd təsərrüfatına ziyanverənlər; parazit; *Stores of grain are frequently attacked by pests, especially rats Ziyanvericilər, xüsusən siçovullar, tez-tez taxıl ehtiyatına hücum edirlər*; **2.** başabəla, zəhlətökən, bezikdirici; *That child is an absolute pest, he keeps ringing the doorbell and then running away O uşaq lap başa bəladır, o həmişə qapının zəngini çalır, sonra da qaçıb gedir*

**pester** ['pestə[r]] *v* **1.** təngə / cana gətirmək, usandırmaq, bezar etmək, bezdirmək; *We were pestered with flies Milçəklər bizi bezdirdilər / cana gətirdilər*; **to ~** *smb.* **with questions** bir kəsi suallarla təngə / cana gətirmək; **to ~** *smb.* **with requests** bir kəsi xahişlə cana / təngə gətirmək; *He pestered me to death O mənim canımı lap boğazıma yığdı; Beggars pestered me for money Dilənçilər pul istəməklə məni cana gətirdilər/bezdirdilər*; **2.** doldurmaq; *The island is pestered adders Ada gürzə ilə doludur*

**pestersome** ['pestəsəm] *adj* təngəgətirən, zəhlətökən, usandıran, bezdirən; cansıxan, darıxdıran

**pesticide** ['pestɪsaɪd] *n* pestisid *(ziyanvericilərə qarşı mübarizə dərmanı)*

**pestilence** ['pestɪləns] *n* **1.** *tib.* taun *(xəstəlik)*; **2.** epidemiya *(yoluxucu xəstəliyin geniş yayılması)*, yoluxucu xəstəlik

**pestilent** ['pestɪlənt] *adj* **1.** öldürücü, məhv-edici, ölümsaçan, zəhərli; **~ plant** zəhərli bitki; **2.** təhlükəli, zərərli, ziyanlı; acı; **~ tongue** acı dil; **~ books** ziyanlı / təhlükəli kitablar; **3.** *d.d.* zəhlətökən, bezdirici, usandırıcı, qarayaxa; **~ fellow** bezdirici / qarayaxa adam; **4.** yoluxucu, yoluxan

**pestilential** [ˌpestɪ'lenʃl] *adj* **1.** taun, tauna tutulmuş, yoluxucu xəstəlik yayan; **~ disease** yoluxucu xəstəlik; **2.** zəhərli, ziyanlı, zərərli, məhvedici; **~ mists** zərərli dumanlar; **~ smell** üfunət; **~ doctrine** ziyanlı doktrina *(elmi, fəlsəfi və ya siyasi nəzəriyyə)*; **3.** *d.d.* çox pis, iyrənc, çirkin, mənfur

**pestle**[1] ['pesl] *n* dəstə *(həvəngdə)*

**pestle**[2] ['pesl] *v* dəstə ilə vurmaq / əzmək *(həvəngdə)*

**pet**[1] [pet] *n* **1.** sevimli ev heyvanı; *Boys often keep rabbits as pets Oğlanlar çox vaxt ələmək üçün evdə dovşan saxlayırlar*; **2.** istəkli / sevimli / ərköyün uşaq; *He is his mother's pet O, anasının istəklisidir / ərköyün balasıdır*; **the ~ of society** cəmiyyətin sevimlisi; **to make a ~ of a child** uşağı ərköyün böyütmək; *My pet! Mənim əzizim!*

◊ **~'s corner** ev heyvanları üçün ayrılmış künc; ev heyvanlarının yeri *(məktəbdə)*

**pet**[2] [pet] *adj* **1.** ev; ələ öyrədilmiş, əhliləşdirilmiş; **a ~ bird** ev quşu; **~ lions** əhliləşdirilmiş aslanlar; **2.** sevimli, istəkli; **~ pupils** sevimli/istəkli şagirdlər, müəllimin istəkliləri; **3.** ən çox sevilən, ən sevimli; **~ subject** ən çox sevilən mövzu / fənn

**pet**[3] [pet] *v* (**-tt-**) **1.** əzizləmək, ərköyün böyütmək, nazlamaq; **to ~ a child** uşağı əzizləmək / ərköyün böyütmək; **2.** *amer.* qucaqlaşmaq, öpüşmək; **3.** ehtirasla / şəhvətlə öpmək

**petal** ['petl] *n bot.* ləçək *(gül yarpağı)*

**petition**[1] [pɪ'tɪʃn] *n* ərizə; xahiş; məlumat, bəyanat; **~ for a divorce** boşanma haqqında ərizə; **to have / to receive** *smb.'s* **~** bir kəsin ərizəsini almaq; **to grant a ~** xahişi yerinə yetirmək; **to make / to lodge a ~** ərizə vermək; **to sign a ~** ərizəyə qol çəkmək; **to present a ~** ərizə vermək / təqdim etmək

**petition**[2] [pɪ'tɪʃn] *v* ərizə vermək, xahiş etmək; **to ~ for mercy** bağışlanmaq / əfv olunmaq üçün xahiş etmək; **to ~ for** *smth.* bir şey üçün xahiş etmək; **to ~ for** *smb.* bir kəs üçün xahiş etmək; *The people petitioned the government to be allowed to return to their country Adamlar vətənlərinə dönməyə icazə almaq üçün hökumətə ərizə verdilər*

**petitioner** [pɪ'tɪʃnə[r]] *n* **1.** ərizəçi, ərizə verən, xahiş edən; **2.** *huq.* iddiaçı, tələb edən

**pet-name**[1] ['petneɪm] *n* nəvazişlə verilən ad

**pet-name**[2] ['petneɪm] *v* **1.** nəvazişli adla çağırmaq; *Public men are often pet-named by British papers Britaniya qəzetləri ictimai xadimlərə tez-tez nəvazişli ad verirlər*; **2.** ev heyvanlarına nəvaziş göstərmək; **3.** şəhvət hissilə öpüşmək, sevişmək

**petrel** ['petrəl] *n zool.* fırtına quşu

**petrified** ['petrɪfaɪd] *adj* **1.** daşlaşmış, daşa dönmüş; **~ fish** daşlaşmış / daşa dönmüş balıq; **2.** ölü, ölmüş; **~ language** ölü dil; **3.** donmuş, donub qalmış, sarsımış; **~ with horror** dəhşətdən donmuş/sarsımış; *She was absolutely petrified with horror O, dəhşətdən sarsımışdı / donub qalmışdı*

**petrify** ['petrɪfaɪ] *v* *(pt, pp* **-fied***)* **1.** daşa çevrilmək, daşlaşmaq; *Wood was petrified Ağac daşa çevrildi / daşlaşdı*; **2.** heyrətləndirmək, heyrətə salmaq; valeh etmək, mat qoymaq; sarsıtmaq; *He petrified the whole neighbourhood by his playing O, oyunu ilə bütün ətrafı heyrətə saldı / mat qoydu; His look petrified the girl Onun baxışı qızı sarsıtdı*; **3.** donub / quruyub qalmaq, qurumaq; *She seemed to petrify when she heard the news Bu xəbəri eşidəndə sanki qız donub qaldı*; **to be petrified with grief / with horror** dərddən / dəhşətdən donub qalmaq; **4.** məzmunsuzlaşdırmaq, məhrum etmək *(ideyadan, məzmundan)*

built on ~s dirəklər üstündə tikilmiş; **to drive in a ~** paya vurmaq; 2. ot saplağı, ot gövdəsi

**pile** [paɪl] *n* II 1. bağlama, topa, yığın, qalaq; **a ~ of books** bir bağlama kitab; **a ~ of stones** bir topa / yığın daş; **a ~ of logs** bir qalaq / yığın şalban; **a ~ of wood** bir qalaq odun; **a ~ of saucers / plates** bir qalaq nəlbəki / boşqab; 2. dəfn tonqalı *(bəzi ölkələrdə, məs. Hindistanda meyiti yandırmaq üçün qalanan)*; 3. nəhəng bina; 4. *d.d.* var-dövlət, çoxlu pul; **to make *one's* ~** var-dövlət yığmaq; 5. *d.d.* çox, bir yığın; **a ~ of troubles** bir yığın dərd-bəla; 6. *fiz.* nüvə reaktoru; **uranium ~** uran reaktoru

**pile** [paɪl] *n* III 1. yun; tük; narın tük; 2. tiftik; **the thick ~ of a bath towel** hamam dəsmalının qalın tiftiyi; **a deep ~ of a carpet** xalçanın dərin tiftiyi

**pile²** [paɪl] *v* I paya vurmaq

**pile** [paɪl] *v* II 1. topa yığmaq, sıra ilə üst-üstə yığmaq *(həm də* **to ~ up**); **to ~ logs on each other** şalbanları sıra ilə üst-üstə yığmaq; *Money was slowly piled up by his father Pulu onun atası yavaş-yavaş/tədricən yığdı*; 2. yükləmək, yük vurmaq; bir-birinin üstünə tökmək / yığmaq; **to ~ coal on a fire** ocağa kömür tökmək; 3. *d.d.* hərəkət etmək; bir yerə toplaşmaq; *The tourists piled towards the exit Turistlər çıxışa toplaşdılar*; **to ~ on** *d.d.* 1) hücum etmək *(bir kəsə)*; 2) dırmaşmaq, dırmaşıb çıxmaq, dəstə ilə girmək / doluşmaq *(qatara və s.)*; *The boys piled on the train Oğlanlar dəstə ilə qatara doluşdular*; 3) *id.* artırmaq, gücləndirmək; **to ~ on the pace** qaçışın sürətini artırmaq; **to ~ up** 1) artırmaq, çoxaltmaq; **to ~ up expenses** xərcləri artırmaq; **to ~ up arms** silahları artırmaq / çoxaltmaq; **to ~ up atomic bombs** atom bombalarının miqdarını / sayını artırmaq; 2) artmaq, çoxalmaq; *His money was piling up Onun pulu artırdı/çoxalırdı*; 3) həddindən artıq doldurmaq; **to ~ up mistakes** dalbadal səhv etmək; 4) yığılmaq, üst-üstə yığılmaq, qalaqlanmaq; *The clouds are piling up Buludlar qalınlaşır / yığılır*;

◊ **to ~ it on** artırmaq, şişirtmək, mübaliğə etmək; *Don't pile it on Özündən/Özünüzdən toxuma/toxumayın, Gopa basma / basmayın*

**piles** [paɪlz] *n pl tib.* babasil

**pilfer** ['pɪlfəʳ] *v* oğurlamaq, aparmaq, çırpışdırmaq

**pilferage** ['pɪlfərɪdʒ] *n hüq.* xırda oğurluq

**pilferer** ['pɪlfərəʳ] *n* xırda şeylər oğrusu

**pilfering** ['pɪlfərɪŋ] *n* xırda oğurluq

**pilgrim¹** ['pɪlgrɪm] *n* ziyarətçi, zəvvar; **muslim ~s on their way to Mecca** Məkkəyə gedən müsəlman ziyarətçiləri / zəvvarları

**pilgrim²** ['pɪlgrɪm] *v* ziyarətə getmək; səyahət etmək, gəzib dolaşmaq

**pilgrimage** ['pɪlgrɪmɪdʒ] *n* 1. zəvvarlıq, ziyarət; **to go on a ~** ziyarətə getmək; 2. *d.d.* səyahət etmə, gəzmə; səyahət; 3. ziyarətgah, ziyarət yeri, xüsusi hörmətə layiq yer / məkan; **a ~ to Shakespeare's birthplace** Şekspirin doğulduğu yerə səyahət, Şekspirin doğulduğu yeri ziyarət etmə

**pill** [pɪl] *n* həb; **to take a ~** 1) həb qəbul etmək; **a vitamin ~** vitamin həbi; *Take a pill daily after meals Yeməkdən sonra gündə bir həb qəbul et / edin*; 2) *d.d.* işlətmə dərmanı qəbul etmək;

◊ **a bitter ~ to swallow** acı həb; xoşagəlməz məsələ / əhvalat; *The defeat in the election was a bitter pill for him to swallow Seçkidə məğlubiyyəti onun üçün ağır/ acı bir həqarət idi*

**pillage¹** ['pɪlɪdʒ] *n* qarət, soyğunçuluq, talan, quldurluq; talan / qarət etmə, talançılıq

**pillage²** ['pɪlɪdʒ] *v* soymaq, qarət etmək, talamaq, çalıb-çapmaq; çapovulçuluq / soyğunçuluq / talançılıq etmək; *The town was pillaged by the invading army İstilaçı ordu şəhəri talan etdi / çapıb-taladı*

**pillar¹** ['pɪləʳ] *n* 1. sütun, dirək; sütunun təməli / əsası; 2. *tik.* dayaq; 3. sütun *(tüstü, alov və s.)*; **a ~ of fire / of smoke** alov / tüstü sütunu

**pillar²** ['pɪləʳ] *v* paya ilə dayaq vermək / vurmaq, dayaq vurub saxlamaq

**pillar-box** ['pɪləbɔks] *n* küçədə qoyulmuş poçt qutusu

**pillar-post** ['pɪləpoust] *n* = **pillar-box**

**pill-bag** ['pɪlbæg] *n amer. d.d.* doktor, həkim

**pill-box** ['pɪlbɔks] *n* 1. həb saxlamaq üçün qutu; 2. *hərb.* uzunmüddətli atəş istehkamı

**pillion¹** ['pɪlıən] *n* motosikletin dal oturacağı

**pillion²** ['pɪlıən] *adj* motosiklet oturacağında oturan; **a ~ passenger** motosikletin dal oturacağında oturan sərnişin

**pillion³** ['pɪlıən] *adv*: **to ride ~** motosikletin dal oturacağında getmək

**pillion-rider** ['pɪljən.raɪdəʳ] *n* motosikletin dal oturacağında gedən *(adam)*

**pillion-seat** ['pɪljənsi:t] *n* motosikletin dal oturacağı

**pillory¹** ['pɪlərɪ] *n* 1. *tar.* rüsvayçılıq payası; 2. *məc.* gülünc, masqara, oyuncaq yerinə qoyulma; **to be in the ~** gülünc vəziyyətdə qalmaq / olmaq; **to put/to set / to fasten in the ~** rüsvayçılıq payasına vurmaq; rüsvay/biabır etmək

**pillory²** ['pɪlərɪ] *v* 1. *(pt, pp* **-ried**) *tar.* rüsvayçılıq payasına vurmaq; 2. biabır / rüsvay etmək, ələ salmaq, masqaraya qoymaq

**pillow¹** ['pɪlou] *n* yastıq, balış; **to plump up the ~s** balışları doldurmaq; *She fell back on to her pillow O geri balışının üstünə uzandı*;

◊ **to take counsel of / to consult with *one's* ~** ≅ *Axşamın xeyrindən səhərin şəri yaxşıdır*

**pillow²** ['pɪlou] *v* 1. başını qoymaq *(bir şeyin üstünə)*; *He pillowed his head on his hand O, başını əlinin üstünə qoydu*; 2. balınc / yastıq qoymaq *(həm də* **to ~ up**); *He was blanketed and pillowed Onun üstünə yorğan saldılar və başının altına balış / yastıq qoydular*



**pillowcase** ['pɪloukeɪs] *n* balışüzü, yastıqüzü

**pillowfight¹** ['pɪloufaɪt] *n* balış davası

**pillowslip** ['pɪlouslɪp] *n* = **pillowcase**

**pilot¹** ['paɪlət] *n* 1. təyyarəçi, pilot; **~ on alert, alert ~** növbətçi pilot; 2. losman *(dəniz su yolunu yaxşı bələd olan dəniz bələdçisi)*; **dock ~** liman pilotu; 3. bələdçi, başçı, yolgöstərən; **to travel without a ~** bələdçisiz səyahət etmək

**pilot²** ['paɪlət] *v* 1. sürmək; idarə etmək; **to ~ a plane** təyyarə sürmək; **to ~ a ship** gəmi sürmək; 2. aparmaq, bələdçilik etmək; *He piloted us to the caves O, mağaralarda bizə bələdçilik etdi*;

◊ **to ~ a bill** *amer.* qanun layihəsini palatadan keçirmək

**pimp¹** [pɪmp] *n d.d.* vasitəçi, aradüzəldən, oğraş; 2. *amer.* alçaq, əclaf, namərd, rəzil

**pimp²** [pɪmp] *v* 1. vasitəçilik etmək; ara düzəltmək, oğraşlıq etmək

**pimple** ['pɪmpl] *n tib.* sızanaq; civzə, düyün, şiş

**pimpled** ['pɪmpld] *adj* = **pimply**

**pimply** ['pɪmplı] *adj* sızanaqlı; **~ skin** sızanaqlı dəri; **a ~ youth** üzü sızanaqlı cavan; **a ~ face** sızanaqlı üz / sifət

**pin¹** [pɪn] *n* 1. sancaq; şpilka, baş sancağı; broşka *(bəzək sancağı)*; nişan; 2. knopka, basmadüymə *(dəftərxanada işlədilən)*; 3. sıxac; 4. *tex.* ox mili *(arabada)*; ox, mehvər; sapfa *(oxun, yaxud valın yataqda hərlənən hissəsi)*; 5. *pl d.d.* ayaqlar; *He's quick on his pins O, ayaqdan itidir/ yüngüldür; He is weak on his pins O, ayaqları üstündə güclə dayanır*; 6. keqlya *(keql oyunu üçün çəlik)*; keql oyunu; 7. çəllək; **~ of beer** bir çəllək pivə;

◊ **to be on ~s and needles** ≅ tikan üstündə oturmaq; **to keep in the ~** sərxoşluqdan çəkinmək, içməmək; **to let loose a ~** sərxoşluğa / içməyə başlamaq; **to put in the ~** içməyi tərgitmək; **to stick ~s into *smb.*** bir kəsi sancmaq / hirsləndirmək; **to look for a ~'s head in a cartload of hay** ≅ ot tayasında iynə axtarmaq

**pin²** [pɪn] *v* **(-nn-)** 1. sancaqlamaq, sancaqla bənd etmək / ilişdirmək; sancaqla çıxartmaq; **to ~ the paper to the board** elanı sancaqla lövhəyə bənd etmək; **to ~ papers together** kağızları sancaqla bir yerə ilişdirmək, kağızları bir yerə sancaqlamaq; **to ~ clothes to a line** paltarları kəndirə sancaqlamaq; 2. deşmək, dəlmək, sancmaq, sancaqlamaq; tıxamaq, tutmaq; **to ~ insects** həşəratları sancaqlamaq *(kolleksiyaya)*; **to ~ holes** deşikləri tutmaq; 3. basıb / sıxıb əzmək; *(həm də* **to ~ down**); *He was pinned down by a fallen tree Yıxılan ağac onu basıb əzdi*; 4. *id.* kürəklərini yerə vurmaq; 5. bərk tutmaq / yapışmaq; **to ~ *smb.* by the throat** bir kəsin boğazından bərk-bərk tutmaq / yapışmaq; 6. salmaq; *The cattle were pinned Naxırı xalxala saldılar*; 7. *d.d.* oğurlamaq, çırpışdırmaq; *I'm sure they intended to pin my money Mən əminəm ki, onlar mənim pulumu çırpışdırmaq / oğurlamaq fikrinə düşmüşdülər*; **to ~ down** *d.d.* 1) tutmaq, qamarlamaq, tapmaq; *I'll pin you down somewhere Mən səni / sizi haradasa tutacam / tapacam*; 2) divara dirəmək, məcbur etmək; **to ~ *smb.* down to facts** bir kəsi faktlar qarşısında qoymaq; **to ~ up** 1) sancaqlamaq, sancaqla bənd etmək; 2) *d.d.* not və mahnı satmaq *(küçədə)*;

◊ **to ~ *smth.* on *smb.*** günahı bir kəsin boynuna qoymaq; **to ~ *one's* faith on *smb.* / *smth.*** bir kəsə / şeyə kor-koranə inanmaq; **to ~ *smb.'s* ears back** *amer.* bir kəsi cəzalandırmaq, bir kəsin qulağını burmaq

**pinafore** ['pɪnəfɔ:ʳ] *n* önlük, döşlük

**pin-case** ['pɪnkeɪs] *n* iynədan, iynə-sancaq qabı

**pince-nez** [.pæns'neɪ] *n (cəmdə dəyişmir)* pensne *(eynək)*

**pincers** ['pɪnsəz] *n (Özündən sonra fel cəmdə işlənir)* 1. kəlbətin; *(həm də* **a pair of ~** ); 2. pinset, maqqaş

**pincer** ['pɪnsəʳ] *v* 1. kəlbətinlə / maqqaşla sıxmaq; 2. *məc.* əziyyət / əzab vermək, incitmək

**pinch¹** [pɪntʃ] *n* 1. çimdik, çimdikləmə, çimdik götürmə; **to give *smb.* a ~** bir kəsi çimdikləmək, bir kəsdən çimdik götürmək; *She gave the boy a pinch on the arm O, oğlanın qolundan çimdiklədi / çimdik götürdü*; 2. sıxma, sıxılma; **the ~ of shoes** ayaqqabının sıxması; *He could not stand the pinch of his tight shoes O, dar ayaqqabısının sıxmasına dözə bilmirdi*; 3. bir çimdik; **a ~ of salt** bir çimdik duz; *Add a pinch of salt Bir çimdik duz əlavə et / edin*; **a ~ of snuff** bir çimdik / bir çəkimlik burunotu; **to take a ~ of snuff** bir çimdik burunotu götürmək; 4. zülm, əziyyət; **~ of poverty** ehtiyacın əziyyəti / zülmü; **~ of hunger** aclığın əziyyəti; **to feel the ~** *d.d.* çətin vəziyyəti hiss etmək, çətin vəziyyətə düşmək; *If it comes to the pinch... Əgər çətin olsa...*; 5. *jarq.* həbs; **to make a ~** həbs etmək;

◊ **at a ~** lazım gəlsə, məcburiyyət qarşısında qalsaq; *We can get six people round the table, at a pinch Lazım gəlsə, biz bu stolun ətrafında altı adam yerləşdirə bilərik*

**pinch²** [pɪntʃ] *v* 1. çimdikləmək; əzmək, ...arasında qoymaq; *The little girl was crying, because somebody had pinched her Balaca qız ağlayırdı çünki, kimsə onu çimdikləmişdi*; **to ~ *one's* finger in the door** barmağını qapının arasında qoyub əzmək; *I have pinched my finger in the door Mən barmağımı qapının arasında qoyub əzmişəm*; **to ~ *smb.'s* nose** bir kəsin burnundan tutmaq/ burnunu tutub sıxmaq; 2. bir çimdik götürmək / əlavə etmək; *He pinched the snuffbox empty by degrees Çimdik-çimdik götürərək o, burunotu qabını boşaltdı*; 3. əzab /

əziyyət vermək; **to be ~ed with cold / hunger** soyuqdan / aclıqdan əziyyət çəkmək; 4. xəsislik etmək, qənaətlə işlətmək; 5. kəsmək, azaltmaq, məhdudlaşdırmaq, sıxışdırmaq; **to ~ smb. in his food** bir kəsin yeməyini azaltmaq/məhdudlaşdırmaq; **to ~ oneself** özünə rəva bilməmək, özünü hər şeydən məhrum etmək; 6. *jarq.* həbs etmək, tutmaq; 7. *jarq.* oğurlamaq, çırpışdırmaq; *Who's pinched my dictionary? Mənim lüğətimi kim çırpışdırıb?; My watch has been pinched Mənim saatımı çırpışdırıblar*; 8. *id. d.d.* bərk sürmək, qovmaq *(atı)*; 9. *k.t.* başını vurmaq, budamaq *(bitkini) (həm də* **to ~ out**);

◊ *That's where the shoe pinches ≅ Deyirəm axı məsələ nədir*; **to know where the shoe ~es** çətinliyin / əngəlin nədə olmasını bilmək

**pinched** [pɪntʃt] *adj* 1. çimdiklənmiş, əzilmiş; **~ finger** əzilmiş barmaq; 2. sıxışdırılmış, sıxıntıya salınmış; kəsilmiş, azaldılmış; *They lived in very pinched circumstances Onlar çox çətin vəziyyətdə yaşayırdılar*; 3. dar *(paltar haq.)*; 4. arıq, üzgün, üzülmüş *(aclıqdan)*; **~ with hunger** aclıqdan üzülmüş; 5. əldən / haldan düşmüş, yorğun, üzgün, tabsız

**pine¹** [paɪn] *n* 1. *bot.* şam, şam ağacı; 2. şam taxtası / oduncağı

**pine²** [paɪn] *adj* 1. şam, şam ağacı; **a ~ forest** şam / şam ağacı meşəsi, şamlıq; **~ needles** şam ağacının iynələri; 2. şam ağacından qayırılmış; **a ~ furniture** şam ağacından qayırılmış/ düzəldilmiş mebel

**pine³** [paɪn] *v* 1. arıqlamaq, zəifləmək, ərimək, əldən düşmək; üzülmək, əzab / iztirab çəkmək; **to ~ with hunger** aclıqdan əzab/əziyyət çəkmək/üzülmək; **to ~ with grief** qəmdən /kədərdən üzülmək; 2. şikayətlənmək, şikayət etmək, gileylənmək; təəssüf etmək, heyfsilənmək; *They were moaning and pining Onlar inildəyir və heyfsilənirdilər*; 3. **(for, after)** çox arzu etmək, bərk istəmək, həsrət çəkmək, həsrətində olmaq; həsrətini çəkmək; *He was pining for home O, evin həsrətini çəkirdi*

**pineapple¹** [ˈpaɪn.æpl] *n bot.* ananas; ananas *(meyvə)*; **fresh ~** tər/təzə ananas; **tinned ~** konservləşdirilmiş ananas

**pineapple²** [ˈpaɪn.æpl] *adj* ananas; **~ juice** ananas şirəsi; **a glass of ~ juice** bir stəkan / bir qədəh ananas şirəsi

**pine-cone** [ˈpaɪnkoun] *n* şam qozası; şam ağacının qozası

**pine-wood** [ˈpaɪnwud] *n* şam / şamağacı meşəsi, şamlıq

**pinfold¹** [ˈpɪnfould] *n k.t.* ağıl *(mal-qara üçün)*; *k.t.* küz

**pinfold²** [ˈpɪnfould] *v* mal-qaranı ağılda saxlamaq

**ping¹** [pɪŋ] *n* 1. vıyıltı *(güllə səsi)*; **the ~ of rifle bullets** tüfəng güllələrinin vıyıltısı; 2. vızıltı *(ağcaqanadın səsi)*; 3. zərbədən əmələ gəlmiş kəskin səs / tıqqıltı; 4. *tex.* ahəstə metal səsi *(mühərrikdə)*

**ping²** [pɪŋ] *v* vıyıldamaq; vızıldamaq *(külək, güllə və s. səsi)*; *The wind was pinging all night long Külək bütün gecəni vıyıldadı / vıyıldayırdı; Mosquitoes were pinging everywhere in the forest Ağcaqanadlar meşənin hər yerində vızıldayırdılar*

**ping-pong** [ˈpɪŋpɔŋ] *(həm də* **table tennis**) *n* stolüstü tennis, pinq-ponq

**pin-head** [ˈpɪnhed] *n* 1. sancağın başı; 2. *məc.* çox balaca şey; 3. *d.d.* küt, kütbeyin, korazehin *(adam)*, axmaq, gic, səfeh *(adam)*

**pin-headed** [ˈpɪnˈhedɪd] *adj d.d.* gic, başıboş, beyinsiz, ağılsız, səfeh, axmaq

**pinion¹** [ˈpɪnɪən] *n* 1. quşun qanadının kənarı; 2. *şair.* qanad

**pinion²** [ˈpɪnɪən] *v* 1. qanadını kəsmək / kəsib gödəltmək; 2. bağlamaq *(əllərini)*; *Both his arms were pinioned Onun əllərinin hər ikisi bağlanılmışdı; They pinioned us with strong ropes Onlar bizim əllərimizi möhkəm kəndirlə bağladılar*

**pinioned** [ˈpɪnjənd] *adj* qanadlı, qanadı olan

**pink¹** [pɪŋk] *n* I 1. *bot.* qərənfil; 2. **(the ~)** ən yüksək səviyyə; ən yüksək dərəcə, zirvə; **in the ~** *d.d.* əla vəziyyətdə, sapsağlam *(səhhət, sağlamlıq haq.)*; **in the ~ of condition** ən yüksək / əla şəraitdə; **the ~ of perfection** kamilliyin zirvəsi; **the ~ of courtesy /-politeness** nəzakətin zirvəsi; 3. çəhrayı rəng; *Pink is her favourite colour Çəhrayı onun sevdiyi rəngdir*

**pink** [pɪŋk] *n* II *zool.* cavan qızılbalıq

**pink²** [pɪŋk] *adj* 1. çəhrayı, qızılgül rəngli; 2. qırmızı; *His face became pink Onun sifəti qızardı*; 3. mülayim, liberal, liberallıq edən

**pink³** [pɪŋk] *v* I 1. çəhrayı olmaq, qızarmaq; *Her cheeks pinked Onun yanaqları qızardı*; 2. çəhrayı rəngə boyanmaq

**pink** [pɪŋk] *v* II 1. dələmək, deşmək, deşik-deşik etmək; yaralamaq, batırmaq *(ucu şiş silahla)*; *He pinked his adversary in the arm O, düşmənini qolundan yaraladı*; 2. *jarq.* bərk zərbə endirmək, döymək *(boks oyununda)*; *He was pinked all over Onu yaxşıca əzişdirdilər*; 3. deşiklə bəzəmək; dilik-dilik/dilim-dilim etmək; *The dress was pinked at the edges Paltarın ətəyi dilim-dilim idi*

**pink** [pɪŋk] *v* III *tex.* tıqqıldamaq, detonasiya vermək, ahəngsiz işləmək *(mühərrik haq.)*

**pinkish** [ˈpɪŋkɪʃ] *adj* açıq-çəhrayı, çəhrayıtəhər

**pinkness** [ˈpɪŋknɪs] *n* 1. çəhrayılıq; çəhrayı rəng; 2. liberallıq, liberalizm

**pinny** [ˈpɪnɪ] *n* = **pinafore**

**pin-point¹** [ˈpɪnpɔɪnt] *n* 1. sancağın ucu; 2. cüzi, çox az; **at this little ~ of time** bu cüzi / çox az vaxt müddətində;

◊ **to be on ~s** iynə üstündə oturmaq

**pin-point²** [ˈpɪnpɔɪnt] *v* 1. dəqiq göstərmək, dəqiq təyin etmək; **to ~ military bases on the map** xəritədə hərbi bazaları dəqiq göstərmək; 2. cəmləşdirmək; **to ~ *one's* attention upon *smb./smth.*** diqqətini bir kəsə/şeyə cəmləşdirmək; 3. *hərb.* hədəfin yerini müəyyən etmək



**pin-prick** [ˈpɪnprɪk] *n* 1. sancaq batması; 2. pərtlik, dilxorluq; peşmançılıq; **to be easily irritated by ~s** xırda şey ucbatından asanlıqla pərt / dilxor olmaq

**pin-stripe** [ˈpɪnstraɪp] *n* nazik açıq zolaq *(parçada)*

**pinto** [ˈpɪntou] *n (pl* **-es** [-ouz]) *amer.* ala at

**pin-up¹** [ˈpɪnʌp] *n d.d. jurnaldan kəsilib divara vurulan qadın kino ulduzunun və ya gözəl qızın şəkli*

**pin-up²** [ˈpɪnʌp] *adj* gözəl, qəşəng, göyçək, sevimli, cazibəli, cəzbedici; ehtiras oyadan; **a ~ girl** cazibəli / cəzbedici qız *(kino ulduzu haq.)*

**piny** [ˈpaɪnɪ] *adj* 1. şam; **~ smell** şam iyi; 2. şamlı, şam bitən; **~ hills** şam bitən təpələr

**pioneer¹** [.paɪəˈnɪəʳ] *n* 1. pioner, ilk kəşf edən; **architectural ~s** memarlığın ilk pionerləri /nümayəndələri; **a ~ of operations on the human heart** insan ürəyində aparılan ilk cərrahiyyə əməliyyatı; **the ~ of Arctic travel** Arktikanı ilk kəşf edən; 2. ilk mühacir, bir yerə köçüb yerləşən ilk adam; **the ~s of the West** Amerikanın qərbinə gələn ilk mühacirlər; 3. pioner

**pioneer²** [.paɪəˈnɪəʳ] *adj* ilk, başlanğıc; pioner; **~ work** ilk / başlanğıc iş; **a ~ plan** ilk / başlanğıc plan; **~ settlers** ilk / birinci mühacirlər; **~ company** *hərb.* istehkamçı batalyon

**pioneer³** [.paɪəˈnɪəʳ] *v* 1. ilk kəşf edən olmaq, pioner olmaq; **to ~ the way for future research** gələcək tədqiqatlara yol açmaqda pioner olmaq; 2. aparmaq; istiqamətləndirmək, istiqamət vermək

**pioneerdom** [.paɪəˈnɪədəm] *n* pionerlik; **the age of ~** ilk mühacirlər əsri

**pious** [ˈpaɪəs] *adj* 1. dindar, mömin, zahid; **a ~ Muslim** dindar / mömin müsəlman; 2. özünü dindar / mömin kimi aparan

**piously** [ˈpaɪəslɪ] *adv* mömincəsinə, dindarcasına, mömin / dindar kimi

**pip¹** [pɪp] *n* I meyvədə olan xırda çəyirdək; **apple / grape / orange ~s** alma / üzüm / portağal çəyirdəkləri

**pip** [pɪp] *n* II 1. *(adət.* **the ~**) dilçək xəstəliyi *(quşlarda)*; 2. *d.d.* pis ovqat / əhvali-ruhiyyə, kefsizlik; **to have the ~** ürəyi sıxılmaq, xiffət etmək, qüssələnmək, darıxmaq; **to give *smb.* the ~** bir kəsin ovqatını təlx etmək, bir kəsin kefini pozmaq / korlamaq; darıxdırmaq, qüssələndirmək

**pip** [pɪp] *n* III 1. xal *(kartda, dominoda)*; 2. *d.d.* ulduz *(poqonda)*; **to be senior by one ~** bir ulduzu artıq olmaq, bir rütbə yuxarı olmaq; 3. *bot.* meyvəköklülər *(çuğundur, yerkökü və s.)*

**pip** [pɪp] *n* IV yüksək qısa siqnal *(radioda)*

**pip²** [pɪp] *v* **(-pp-)** I 1. ciyildəmək, cikkildəmək, cibbildəmək; cik-cik etmək; 2. çıxmaq *(yumurtadan)*

**pip** [pɪp] *v* **(-pp-)** II 1. vurmaq, yaralamaq; vurub yaralamaq *(güllə ilə)*; 2. qalib gəlmək, məğlub etmək; **to be ~ped on the post** *id.* son dəqiqədə məğlub olmaq / müvəffəqiyyətsizliyə uğramaq; 3. rədd etmək, səs verməmək *(seçkidə)*; 4. kəsmək, pis qiymət vermək *(imtahanda)*; *He was pipped O kəsildi, Ona pis qiymət verdilər (imtahanda)*; 5. yararsız hesab etmək; *He was pipped for active service Onu həqiqi hərbi xidmətə yararsız hesab etdilər*

**pipage** [ˈpaɪpɪdʒ] *n* 1. vurma, çəkib vurma *(nasosla bir yerdən başqa yerə)*; boru kəməri ilə vurma; 2. boru kəmərilə vurma xərci; 3. boru kəməri çəkmə; 4. boru kəməri sistemi

**pipe¹** [paɪp] *n* I 1. boru; **to lay ~s** boru çəkmək; 2. boru kəməri; 3. qəlyan; **to light / to smoke a ~** qəlyan çəkmək; **to puff at *one's* ~** qəlyanı ilə qüllab vurmaq; 4. sümsü, tütək, ney; 5. *pl* volinka *(xalq musiqi aləti)*; 6. oxuma *(quş və s. haq.)*; fit, vıyıltı, vızıltı; **the thin ~ of gnats** ağcaqanadların zəif vızıltısı; 7. səs; **to have a fine ~** yaxşı / gözəl / məlahətli səsi olmaq; 8. *pl d.d.* uzunboğaz çəkmə;

◊ **to set up *one's* ~s** qışqırmaq, bağırmaq, çığırmaq, fəryad / fəğan etmək; **to put *smb.'s* ~ out** 1) bir kəsə ziyan vurmaq, bir kəsin işini korlamaq; 2) bir kəsi öldürmək / məhv etmək; **to smoke the ~ of peace** barışmaq, razılaşmaq

**pipe** [paɪp] *n* II çəllək *(şərab və ya yağ üçün)*

**pipe²** [paɪp] *v* I 1. sümsü / tütək / ney çalmaq; **to ~ a song** tütəkdə/neydə nəğmə çalmaq; 2. sümsü ilə çağırmaq; 3. vıyıldamaq *(külək, güllə haq.)*; *The bullets were piping all around us Bütün ətrafımızda güllələr vıyıldayırdı*; 4. oxumaq *(quş haq.)*; 5. ciyildəmək, cikkildəmək, cibbildəmək; uca səslə danışmaq; **to ~ out a hurrah** uca səslə «Ura» qışqırmaq; 6. *d.d.* qəlyan çəkmək; *They never stopped except to pipe Onlar ancaq qəlyan çəkmək üçün fasilə edirlər / dayandılar*; 7. boru ilə təchiz etmək; 8. kəmərlə /boru ilə nəql etmək; **to ~ water into a house** evə boru ilə su çəkmək; **to ~ away** *dən.* yola düşmək / sahildən ayrılmaq üçün siqnal vermək; **to ~ up** 1) oxumaq, oxumağa başlamaq; çalmaq, çalmağa başlamaq; danışmaq, danışmağa başlamaq; 2) güclənmək, bərkimək, şiddətlənmək *(külək və s. haq.)*; *The wind began to pipe up Külək güclənməyə / şiddətlənməyə başladı*; **to ~ down** səsi/ danışığı azaltmaq; *Kids, pipe down, will you? I'm on the phone Uşaqlar, bir az yavaş danışın, da?! Axı mən telefonla danışıram*

**pipe¹** [paɪp] *v* II *bağç.* bicləri / kənar budaqları kəsmək / vurmaq

**pipedream** [ˈpaɪpdriːm] *n* başagəlməz arzu, xam xəyal, xülya

**pipeline¹** [ˈpaɪplaɪn] *n* boru kəməri; **to lay a ~** boru kəməri çəkmək

**pipeline²** [ˈpaɪplaɪn] *v* **1.** boru kəməri çəkmək; **2.** boru kəməri ilə çəkib vurmaq *(maye haq.)*

**pipeorgan** [ˈpaɪp.ɔ:gən] *n mus.* orqan, ərğənun *(içərisinə körüklə hava vurularaq çalınan dilli musiqi aləti)*

**piper** [ˈpaɪpəʳ] *n* **1.** tuluq zurnası çalan; tütəkçalan, neyçalan, sümsüçalan; **2.** sürülüb əldən salınmış / sancılanmış at; **3.** *d.d.* xəfiyyə, casus;

◊ *He who pays the piper calls the tune at. söz.* ≅ *Keçəl halva yeyər puluna minnət*

**pipette** [pɪˈpet] *n* damcıtökən, pipet

**pipework** [ˈpaɪpwə:k] *n* boruçəkmə işi

**piping¹** [ˈpaɪpɪŋ] *n* **1.** sümsüdə / neydə / tütəkdə çalma; **2.** sümsü / ney/tütək səsi; **3.** kəskin / güclü / şiddətli / qulaqbatıran səs; **the frosty ~s of the breeze** şaxtalı küləyin səsi / vıyıltısı; **4.** ciyilti, civilti; **the ~ of mice** siçovulların ciyiltisi; **5.** quşun oxuması; **6.** ana arının vızıltısı; **7.** *d.d.* ağlama, ağlamaq səsi; bağırtı; **8.** bəzək, naxış *(tortun üstündə)*; bəzəmə *(tortu)*; **9.** boru kəməri; boru sistemi

**piping²** [ˈpaɪpɪŋ] *adj* **1.** tütəkdə çalan; **2.** kəskin, qulaqbatıran; ciyiltili; **a thin ~ voice** nazik ciyiltili səs; **~ breeze / wind** vıyıltılı külək; **3.** *məc.* yenicə bişmiş; tamamilə təzə, təzə, tər; **~ hot from the university** universiteti təzəcə / yenicə qurtarmış; *The book has come out piping hot Kitab çapdan yenicə çıxıb;*

◊ **~ hot** bərk / çox isti; *That day was piping hot O gün bərk / çox isti idi*

**pipy** [ˈpaɪpɪ] *adj* **1.** boruşəkilli, boruyaoxşar; **2.** kəskin, qulaqbatırıcı; **a ~ voice** kəskin / qulaqbatırıcı səs; **3.** *d.d.* ağlağan; **a ~ child** ağlağan uşaq

**piquancy** [ˈpi:kənsɪ] *n* tündlük, kəskinlik; **to impart ~ to the food** yeməyə tündlük vermək, yeməyi tündləşdirmək

**piquant** [ˈpi:kənt] *adj* **1.** tünd, kəskin; **~ sauce** tünd sous; *The peppers give the sauce a piquant flavour İstiot sousa kəskin dad verdi;* **2.** şirnikdirici, tamahsılandırıcı, həvəsləndirici; cazibəli, cəzbedici, ehtiras doğuran / oyadan; **her ~ profile** onun cəzbedici profili; **~ remark** şirnikdirici/həvəsləndirici eyham

**pique¹** [pi:k] *n* pərtlik, dilxorçuluq, dilxorluq; peşmançılıq; qıcıqlanma, hirs, acıq; qıcıq; **to take a ~ against** ***smb.*** bir kəsdən incimək /küsmək; **feeling of ~** peşmançılıq hissi; **in a fit of ~** hirsli / hirslənmiş halda; *When he realized nobody was listening to him, he left the room in a fit of pique O, anlayanda ki, heç kim ona qulaq asmır, pərt halda otağı tərk etdi*

**pique²** [pi:k] *v* **1.** sancmaq, acılamaq, toxunmaq, təhqir / pərt etmək, qanını qaraltmaq; *He's piqued about something Nəsə ona toxunub;* **2.** oyatmaq, oyandırmaq, doğurmaq; **to ~ *smb.'s* curiosity** bir kəsdə maraq oyatmaq; **3.** *av.* şığımaq

**piracy** [ˈpaɪərəsɪ] *n* **1.** piratlıq, dəniz quldurluğu; **2.** müəllif hüququnun pozulması

**pirate¹** [ˈpaɪərɪt] *n* **1.** pirat, dəniz quldurur; **2.** müəllif hüququnu pozan; **3.** pirat gəmisi; **4.** başqa marşrutda hərəkət edən xüsusi avtobus, belə avtobusun sürücüsü

**pirate²** [ˈpaɪərɪt] *v* **1.** piratlıq etmək; talan / qarət etmək, çalıb-çapmaq; **2.** müəllif hüququnu pozmaq, müəllifin icazəsi olmadan onun əsərini çap etmək və satmaq

**piratical** [.paɪˈrætɪkl] *adj*: **to give *smb.* a ~ look** bir kəsə pirat görkəmi vermək; *His beard and black eye-patch gave him a piratical look Saqqalı və gözündəki qara sarğı ona pirat görkəmi verirdi*

**pirouette** [.pɪruˈet] *n* **1.** piruet *(rəqsdə: bir ayağının ucunda dönmə / fırlanma)*; **to perform a ~** piruet etmək; **2.** dayanmış halda tam fırlanma *(gimnastikada)*

**pirouettee** [.pɪruˈet] *v* piruet etmək *(bax:* **pirouette)**

**piss¹** [pɪs] *n* sidik; **to have a ~** siymək, işəmək; **to go for a ~** siyməyə / işəməyə getmək

**piss²** [pɪs] *v* işəmək, siymək; **to ~ oneself *(laughing)*** işəyib özünü batırmaq *(gülməkdən)*

**pistol¹** [ˈpɪstl] *n* tapança; **to put a ~ to *one's* head** özünü tapança ilə vurmaq, başına tapança sıxmaq; **to hold / to put a ~ to *smb.'s* head 1)** tapançanı bir kəsin gicgahına sıxmaq; **2)** bir kəsi çıxılmaz vəziyyətə salmaq

**pistol²** [ˈpɪstl] *v* tapança atmaq

**pistol-shot** [ˈpɪstlʃɔt] *n* **1.** tapança atəşi; **2.** tapança gülləsinin çata biləcəyi məsafə

**pit¹** [pɪt] *n* **I 1.** quyu; çala, çuxur; boşluq; **air ~** hava boşluğu; **to dig / to excavate a ~** quyu / çala qazmaq; **2.** *hərb.* biradamlıq səngər; **3.** şaxta, mədən, mədən ocağı; karxana; **4.** tərəvəz saxlamaq üçün quyu /çala; **5.** təmir yeri *(avtomobil yarışlarında)*; **6.** tələ *(həm də məc.)*; **7.** çopurluq, çopur yeri; **a few ~s of the smallpox** çiçək xəstəliyindən qalmış bir az çopurluq; **a surface marked by raindrop ~s** yağış damcısından əmələ gəlmiş çopurluq *(torpaqda yağış damcılarının yeri)*; **8.** orkestr üçün yer; **9.** xoruz döyüşdürmək üçün meydan; **10.** *arx.* zindan, məhbəs;

◊ **to dig a ~ for *smb.*** bir kəsə quyu qazmaq; **to fly / to shoot the ~ 1)** qorxmaq; **2)** xəlvəti qaçmaq, əkilmək

**pit** [pɪt] *n* **II** *amer.* meyvə çəyirdəyi; **to remove the ~s** çəyirdəkləri çıxarmaq

**pit²** [pɪt] *v* **(-tt-) I 1.** iz qoymaq / buraxmaq, səthdə xırda çuxurlar əmələ gətirmək; *Acid had pitted the surface of the silver Turşu gümüşün səthində xırda-xırda çuxurlar əmələ gətirmişdi; The surface of the moon is pitted with craters Ayın səthi kraterlərdən girintili-çıxıntılıdır;* **2.** saxlamaq üçün quyuya qoymaq *(xüs. tərəvəzi)*; **to ~ potatoes** kartofu quyulamaq / quyuya qoymaq *(saxlamaq üçün)*; **3.** iz buraxmaq, çopurlaşmaq; *Her face was pitted with smallpox Onun sifəti çiçək xəstəliyindən çopurlu idi/ çopurlaşdı;* **4. (against)** qızışdırmaq, salışdırmaq *(xoruzları)*; **5. (against)** tab gətirmək, qarşı durmaq, dayanmaq, sinə gərmək; **to ~ oneself against heavy odds** böyük çətinliklərə sinə gərmək / tab gətirmək

**pit** [pɪt] *v* **(-tt-) II** çəyirdəkləri çıxartmaq; **to ~ cherries** albalıların çəyirdəyini çıxartmaq; **to ~ peaches** şaftalıların çəyirdəyini çıxartmaq

**pitted** [ˈpɪtɪd] *adj* çəyirdəyi çıxarılmış; **~ peaches/cherries/apricots, *etc.*** çəyirdəyi çıxarılmış şaftalılar / albalılar / əriklər *və s.*

**pit-a-pat¹** [.pɪtəˈpæt] *n* = **piter-pater¹**

**pit-a-pat²** [.pɪtəˈpæt] *adv* = **piter-pater²**

**pit-a-pat²** [.pɪtəˈpæt] *adv (həm də* **pitter-patter** [ˈpɪtəpætəʳ]) döyünən, titrəyən, əsən; *Her heart went pit-a-pat Onun ürəyi döyünməyə başladı*

**pitch¹** [pɪtʃ] *n* **I 1.** qatran; bişmiş qatran; zift; pek *(qatran distilləsindən sonra qalan qatı maddə)*; **2.** bitum *(asfalt, qudron və s.)*;

◊ **black / dark as ~** qatran kimi qara; **to touch ~** şübhəli şəxslə iş görmək

**pitch** [pɪtʃ] *n* **II 1.** sıçrama; tullama; *It was a fine pitch Bu uğurlu sıçrayış/ tullanma idi;* **2.** *(bir)* qucaq; **the ~ of hay** bir qucaq ot; **3.** bazara çıxarıla bilən bir partiya mal; **a ~ of cheese / of butter / of milk, *etc.*** bir partiya pendir / yağ / süd *və s.*; **4.** güc, səviyyə, intensivlik; **the ~ of light** işığın gücü /intensivliyi; **at the ~ of *one's* voice** güclü /yüksək səslə; *Excitement rose to the utmost pitch Çaxnaşma ən yüksək səviyyəyə çatdı;* **5.** daimi yeri olan *(küçə alverçisinin/natiqinin)*; **6.** *id.* meydança; **football ~** futbol meydançası; **hockey ~** hokkey meydançası; **7.** meyl; eniş; **houses with roofs of steep ~** kəskin enişli / meylli damı olan evlər; **8.** *amer. d.d.* məram, məqsəd, vəzifə; *I think I get the pitch Mənə elə gəlir ki, mən vəzifənin nə olduğunu anlayıram; What's the pitch? Nə olub? Nə baş verib?;* **9.** *amer. d.d.* zarafat, hənək; **10.** cəfəngiyyat, boşboğazlıq, boş söhbət / danışıq; **to have a ~** laqqırtı vurmaq, söhbət etmək

**pitch²** [pɪtʃ] *v* **I** qatranlamaq, qatran çəkmək / hopdurmaq

**pitch** [pɪtʃ] *v* **II 1.** tikmək, qurmaq; **to ~ a tent** çadır qurmaq; **2.** yerləşmək; *He invited us to pitch on a spot close to the village O bizə təklif etdi ki, biz kəndin yaxınlığında bir yerdə yerləşək;* **3.** qoymaq; dik qoymaq; **to ~ a ladder against a wall** nərdivanı divara (dik) qoymaq; **4.** atmaq, tullamaq, tolazlamaq; **to ~ hay** yaba ilə ot atmaq; **5.** satışa qoymaq; *A large consignment of goods was pitched yesterday Dünən satışa böyük partiya mal qoyuldu;* **6.** düşmək, dəymək; **to ~ on *one's* head** başı dəymək, başıüstə düşmək; *The ball pitched on a stone Top daşa dəydi;* **7.** *mus.* müəyyən yüksəkliyə malik olmaq; *These songs are pitched too high / too low for me Bu mahnılar mənim üçün çox yüksək / çox aşağı tondadır;* **to ~ *one's* voice higher / lower** səsini qaldırmaq / alçaltmaq; **to ~ *one's* voice correctly** səsini düzgün tona salmaq; **8.** müəyyən hədd qoymaq, lazımınca qiymətləndirmək; **to ~ an estimate too low** çox aşağı qiymət vermək; **to ~ *one's* aspirations too high** şöhrətpərəst arzularla həddindən artıq lovğalanmaq; *She was pitching her hopes too high Onun ümidləri çox yüksək idi;* **9.** *amer.* lovğalanmaq, özünü öymək / tərifləmək; şişirtmək; **10.** yonmaq *(daşı)*; **to ~ in** ciddi başlamaq / girişmək *(bir işə)*; *I took a spade and pitched right in Mən bir bel götürüb dərhal işə ciddi girişdim;* **to ~ into** üstünə tullanmaq / atılmaq, şığımaq, hücum etmək; cummaq *(yeməyə)*; *He sat down and pitched into his meal O oturdu və yeməyinə cumdu;* **to ~ over** çevrilmək, arxası üstə düşmək;

◊ **to ~ *one's* tent** bir yerdə qərar tutmaq; **to ~ a party** *amer.* qonaqlıq düzəltmək; **to be ~ed off *one's* horse 1)** ruhdan salınmaq; **2)** çətin vəziyyətə salınmaq

**pitch-black** [.pɪtʃˈblæk] *adj* qatran kimi qara / qaranlıq; **a ~ night** qatran kimi qaranlıq/zülmət gecə

**pitch-dark** [.pɪtʃˈda:k] *adj* tam / tamam / bərk qaranlıq; *It's pitch-dark outside – you won't be able to see a thing Bayırda qatran kimi qaranlıqdır, heç nə görmək mümkün deyil*

**pitcher** [ˈpɪtʃəʳ] *n* **I** səhəng, bardaq;

◊ **~s have ears** ≅ *Divarın da qulağı var; The pitcher goes often to the well, but it is broken at last at. söz.* ≅ *Su səhəngi / bardağı suda sınar*

**pitcher** [ˈpɪtʃəʳ] *n* **II 1.** küçə alverçisi *(müəyyən bir yerdə mal satan)*; **2.** bülöv daşı, çay daşı *(yerə döşəmək üçün)*; **3.** *d.d.* əyyaş; **4.** *id.* beysbol oyununda topu oyuna daxil edən oyunçu

**pitchfork¹** [ˈpɪtʃɔ:k] *n* **I** ot yabası;

◊ *It's raining pitchfork Leysan yağır*

**pitchfork** [ˈpɪtʃfɔ:k] *n* **II** kamerton *(musiqi alətlərini kökləmək üçün səsindən istifadə edilən kiçik polad alət)*

**pitchfork²** [ˈpɪtʃfɔ:k] *v* **1.** yaba ilə vermək/atmaq /yığmaq *(otu)*; **2.** *məc.* gözlənilmədən yüksək vəzifəyə təyin etmək; *He was pitchforked into the job by destiny O gözlənilmədən taleyin əlilə yüksək rütbəyə / vəzifəyə çatdı*

**pitchy** [ˈpɪtʃɪ] *adj* **1.** qatranlı; qatranlanmış, qatran hopdurulmuş / sürtülmüş; **2.** qatran kimi qara, qaranlıq; **the ~ night** qatran kimi qaranlıq gecə; **3.** alçaq, əclaf, rəzil

**piteous** [ˈpɪtɪəs] *adj* yazıq, acınacaqlı; zavallı, zəlil; yalvarıcı, yazıq gələcək; **a ~ state** acınacaqlı/zavallı/zəlil vəziyyət; *The house was in piteous condition Ev acınacaqlı vəziyyətdə idi;* **a ~ cry** yazıq gələcək / zavallı qışqırıq; *The dog in the empty house gave a piteous cry Boş otaq-*

*dakı it yalvarıcı bir səs çıxartdı*; ~ **groan** kədərli inilti

**piteously** [ˈpɪtɪəslɪ] *adv* yazıq-yazıq, zavallı-zavallı, zəlil-zəlil, acınacaqlı bir tərzdə

**piteousness** [ˈpɪtɪəsnɪs] *n* yazıqlıq, zavallılıq, zəlillik, acınacaqlı vəziyyət

**pitfall** [ˈpɪtfɔːl] *n* **1.** tələ, tor, duzaq, cələ; hiylə, kələk; **2.** səhv, xata, çaşma; *The article avoids the usual pitfalls Bu məqalədə adi səhvlər yoxdur*

**pith** [pɪθ] *n* **1.** lət, meyvənin əti; yumşaq ət; **2.** *bot.* özək *(bitkidə)*; **3.** *anat.* onurğa beyni, haram ilik; **4.** mahiyyət, məğz, əsas mətləb; *(həm də* **the** ~ **and marrow)** **the** ~ **and marrow of the country** ölkənin əsas qüvvələri; **the** ~ **of her argument** onun arqumentinin mahiyyəti /məğzi; **to get the** ~ **(and marrow) out of a book** kitabın əsl mahiyyətini anlamaq / başa düşmək

**pithily** [ˈpɪθɪlɪ] *adv* mətləbdən, mahiyyətdən; **to speak/to write** ~ mətləbdən danışmaq / yazmaq

**pithless** [ˈpɪθlɪs] *adj* **1.** zəif, gücsüz, qüvvəsiz, cansız, süst, ləng; **2.** *bot.* özəksiz, özəyi olmayan

**pithy** [ˈpɪθɪ] *adj* **1.** *bot.* özəkli, özəyi olan; **2.** yığcam, qısa, müxtəsər *(üslub haq.)*; lakonik; **a plain / a short** ~ **lecture** sadə / lakonik mühazirə; **3.** mənalı, ifadəli; **a sharp** ~ **glance** kəskin və ifadəli / mənalı baxış

**pitiable** [ˈpɪtɪəbl] *adj* **1.** acınacaqlı, yazıq, bədbəxt, zavallı, zəlil; ~ **condition** zavallı / acınacaqlı vəziyyət; **2.** az, cüzi, çox kiçik / az / əhəmiyyətsiz / dəyərsiz; ~ **minority** cüzi azlıq

**pitiful** [ˈpɪtɪfl] *adj* **1.** əzablı, əziyyətli; iztirablı; mərhəmətli, rəhmli, rəhmdil, ürəyiyumşaq, yumşaqürəkli; **to be** ~ **to** *smb.* bir kəsə qarşı rəhmli / mərhəmətli olmaq; **2.** qəmli, kədərli, acınacaqlı; ~ **sight** kədərli / qəmli / acınacaqlı mənzərə; **a** ~ **account of** *smth.* bir şey haqqında qəmli / kədərli hekayət; **3.** az, çox az / cüzi; dəyərsiz, yararsız; **a copy of** ~ **verses** yararsız / dəyərsiz şerlər

**pitifully** [ˈpɪtɪfəlɪ] *adv* qəmli-qəmli, qəmgincəsinə, kədərli-kədərli, kədərli / qəmgin bir tərzdə

**pitifulness** [ˈpɪtɪflnɪs] *n* qəmlilik, kədərlilik, acınacaqlı vəziyyət

**pitiless** [ˈpɪtɪlɪs] *adj* amansız, rəhmsiz, zalım, qəddar, daşürəkli, mürvətsiz; **a** ~ **killer** amansız / qəddar qatil; **a** ~ **tyrant** qəddar /zalım müstəbid; **a** ~ **attack** amansız hücum

**pitman** [ˈpɪtmən] *n* *(pl* **-men** [-mən]) şaxtaçı, kömürçıxaran, qazmaçı *(fəhlə)*

**piton** [piːˈtɔːŋ] *n* qarmaq; çəngəl, qənarə *(alpinistlərin işlətdiyi)*

**pittance** [ˈpɪtns] *n* **1.** qəpik-quruş; **to earn a scanty** ~ qəpik-quruş qazanmaq; **to work all day for a** ~ bütün günü qəpik-quruşa işləmək; **2.** çox az, cüzi, az / cüzi miqdar; **a miserable** ~ **of instruction** cuzi / çox az təhsil

**pitter-patter¹** [ˈpɪtəpætəʳ] *n* döyünmə, titrəmə, əsmə, yüngül tıqqıltı / tappıltı; **the soft** ~ **of the rain on the roof** yağışın damda yüngül tıqqıltısı/tapıltısı; **the** ~ **of horses' hoofs** at dırnaqlarının yüngül tappıltısı

**pitter-patter²** [ˈpɪtəpætəʳ] *adv* döyünə-döyünə, titrəyə-titrəyə, əsə-əsə; *Her heart went pitterpater Onun ürəyi döyünməyə başladı*

**pity¹** [ˈpɪtɪ] *n* **1.** rəhm, şəfqət, mərhəmət; yazığı gəlmə, ürəyi / canı yanma, acıma; **to have / to take** ~ **on / upon** *smb.* bir kəsə canı/ürəyi yanmaq/yazığı gəlmək, bir kəsə rəhm etmək /mərhəmət göstərmək; *Have pity on us Bizə yazığın / yazığınız gəlsin!* **to feel** ~ **for** *smb.* bir kəsə rəhmi / yazığı gəlmək; **to move** *smb.* **to** ~ bir kəsi mütəəssir etmək, bir kəsə toxunmaq, bir kəsi həyəcanlandırmaq; **to excite** ~ rəhm / şəfqət / mərhəmət oyatmaq; **2.**: *It's a pity! Heyf! Heyf (ki), Təəssüf (ki), Əfsus (ki); It's a thousand pities d.d. Çox təəssüf (ki), Çox heyf (ki), Çox əfsus (ki); What a pity! Çox heyf! Çox əfsus! Çox təəssüf! What a pity I didn't know of it Çox təəssüf ki, mən onu bilməmişəm*

**pity²** [ˈpɪtɪ] *v (pt, pp* **pitied)** **1.** yazığı / rəhmi gəlmək; halına acımaq, dərdinə/ qəminə şərik olmaq; **to take** ~ **on** *smb.* bir kəsə yazığı gəlmək; *I took pity on the beggar and gave him some money Mənim dilənçiyə yazığım gəldi və ona bir az pul verdim; He is to be pitied Ona yazığgəlməlidir*; **2.** təəssüf etmək, peşman olmaq, heyfsilənmək; dərdinə / qəminə şərik olmaq; *I pity you if you cannot answer such a simple question Belə sadə suala cavab verə bilməsən / bilməsəniz, mənim sənə / sizə yazığım gələr*

**pivot¹** [ˈpɪvət] *n* **1.** dayaq nöqtəsi; **2.** əsas nöqtə, mərkəz; **the** ~ **of economic life** iqtisadi həyatın əsası; *The mother is often the pivot of family life Ana çox vaxt ailə həyatının dayağı olur*

**pivot²** [ˈpɪvət] *v* **1.** fırlanmaq, hərlənmək; dolanmaq; **to** ~ **on** *one's* **heels** dabanları üstündə fırlanmaq; **to** ~ **on/upon** asılı olmaq; *The entire question pivots upon that island Bütün məsələ bu adadan asılıdır*; **2.** *id.* dönmək, çevrilmək; **3.** *tex.* oxa bərkitmək

**pivotal** [ˈpɪvətl] *adj* **1.** mərkəzi, mərkəzdə olan; **2.** əsas, başlıca, ən mühüm; həlledici; ~ **fact** əsas fakt / sübut; ~ **figure** başlıca fiqura, əsas / mühüm şəxs; **to play a** ~ **role** əsas / həlledici rol oynamaq

**placard¹** [ˈplækaːd] *n* elan; plakat; **to hang a** ~ elan / plakat asmaq; *A placard was hung to call the attention of the people Adamların diqqətini cəlb etmək üçün elan asılmışdı*

**placard²** [ˈplækaːd] *v* **1.** elan asmaq / vurmaq; *Bills were placarded on the walls Elanlar divarlara vurulmuşdu*; **2.** satış üçün elandan istifadə etmək; **to** ~ **a sale** satış haqqında elan vermək

**placate** [pləˈkeɪt] *v* sakitləşdirmək, sakit / təskin etmək; **to** ~ *smb.'s* **anger** bir kəsin acığını / qəzəbini soyutmaq

**placatory** [ˈplækətrɪ] *adj* sakitləşdirici, sakit edən

**place¹** [pleɪs] *n* **1.** yer, məkan; **a wet** ~ **on the floor**



döşəmədə nəm / yaş yer; **a rough** ~ **on the road** yolda kələ-kötür yer; **to move from** ~ **to** ~ bir yerdən başqa yerə getmək; **to come to a** ~ bir yerə gəlmək; *I can't be at two places at once Mən eyni vaxtda iki yerdə ola bilmərəm; What place do you come from? Sən / Siz haralısan? / haralısınız?*; ~ **of destination** gediləcək yer, mənzil başı; **starting** ~ *id.* mərkəzi dairə; **jumping** ~ tullanma / hoppanma yeri; **landing** ~ *av.* enmə / oturma yeri; **holy** ~**s** müqəddəs yerlər; *Show me the sore place on your arm Qolunun / Qolunuzun ağrıyan yerini mənə göstər / göstərin*; **to put a book in its** ~ kitabı yerinə qoymaq; **to put** *smth.* **in the wrong** ~ bir şeyi öz yerinə qoymamaq; **2.** yerli, yerində, uyğun, münasib; *The proposal is not quite in place Bu təklif heç də uyğun / münasib deyil*; **out of** ~ **1)** yerində olmama; *The book is out of (its) place Kitab (öz) yerində deyil*; **2)** yersiz, münasib olmayan; **remark out of** ~ yersiz irad; **to give** ~ **to** *smb. / to smth.* bir kəsə / şeyə yer vermək; **3.** oturacaq *(sinifdə, stol arxasında, qatarda və s.); Go back to your place Öz yerində / yerinizdə otur / oturun; There's no place for him Onun üçün yer yoxdur*; **to change** ~**s with** *smb.* bir kəslə oturduğu yeri dəyişmək; **to book / to engage** ~**s** bilet sifariş etmək; **a** ~ **of amusement** əyləncə yeri; **a** ~ **of resort** istirahət yeri; **4.** *d.d.* ev, mənzil; *Come round to my place tonight Bu axşam bizə gəl / gəlin*; **5.** malikanə, mülk; *He has a place in the country Onun şəhər kənarında malikanəsi / mülkü var*; **6.** iş yeri, vəzifə; *He has got a place in the Customs House O, gömrükxanada işə girib; He worked ten years in his last place O, sonuncu iş yerində on il işlədi*; **out of a** ~ vəzifəsiz, işsiz; **the** ~ **of President** prezident vəzifəsi; **to take** *smb.'s* ~ **1)** bir kəsi əvəz etmək *(vəzifədə)*; **2)** bir kəsin yerini tutmaq *(vəzifədə)*; **7.** *id.* yarışda üç yerdən biri; **to get a** ~ finişə ilk gələnlər arasında olmaq;

◊ **in** ~ **of** yerinə, əvəzinə; **in the first** ~ hər şeydən öncə / əvvəl; **in the second** ~ ikincisi; **in the next** ~ sonra; **to take** ~ baş / üz vermək, vaqe olmaq; *Changes have taken place Dəyişikliklər baş verib; It took place last year Bu keçən il baş verdi; This marriage will not take place Bu izdivac baş tutmayacaq; There is no place like home at. söz* ≅ *Gəzdim aran-turanı, cənnət gördüm buranı (yəni vətəni), Gəzməyə qərib ölkə, ölməyə vətən yaxşı*

**place²** [pleɪs] *v* **1.** qoymaq, yerləşdirmək; *He placed the money into his pocket O, pulu cibinə qoydu; I placed my hand on his shoulder Mən əlimi onun çiyninə qoydum; A bomb had been placed under the seat Bomba oturacağın altına qoyulmuşdu / yerləşdirilmişdi; The house is well placed Ev münasib yerdə yaxşı yerləşdirilib*; **to** ~ **no restrictions on** *smth.* bir şeyə heç bir məhdudiyyət qoymamaq; **to** ~ **a question on the agenda** məsələni gündəliyə daxil etmək / salmaq / çıxartmaq; **to** ~ **a seal to a document** sənədə möhür vurmaq; **2.** vəzifəyə təyin etmək / qoymaq; **to** ~ *smb.* **in an office** bir kəsi idarədə işə götürmək / qoymaq; **to** ~ *smb.* **in a good situation** bir kəsi yaxşı vəzifəyə qoymaq; **3.** mal / səhm satmaq; *Difficult to place Pis satılır*; **4. (in, on)** bəsləmək *(ümid və s.)*, bel bağlamaq, inanmaq; **to** ~ **confidence in** *smb.* bir kəsə ümid bağlamaq / inanmaq; *No confidence can be placed in any of the five judges Bu beş hakimdən heç birinə inanmaq / bel bağlamaq olmaz*; **5.** yerini və ya tarixini təyin etmək; **to try to** ~ **the spot where the plane landed** təyyarənin enəcəyi yeri təyin etməyə çalışmaq; **to** ~ **a manuscript** əlyazmanın tarixini müəyyən etmək; *The manuscript was placed not later than the tenth century Müəyyən edildi ki, əlyazmanın tarixi onuncu əsrdən o yana deyil; I know his face but cannot place him Onun sifəti mənə tanışdır, lakin onu harada gördüyümü xatırlaya bilmirəm; He is a difficult man to place Onun necə adam olduğunu müəyyənləşdirmək çətindir; As a poet I place him among the first Şair kimi mən onu birincilər sırasına qoyuram*; **6.** *id.* yarışda tutduğu yeri müəyyənləşdirmək; **7.** *id.* birinci yerlərdən birini vermək; **to be** ~**ed** *id.* ilk üçlük arasında olmaq; **to be well / badly** ~**d** yaxşı / pis yer tutmaq; **8.** *id.* finişə birinci gələnlər arasında olmaq, yarışda mükafata layiq yer tutmaq

**placebo** [ˈpleɪsbou] *n* *(pl* **-os** [-ouz]) *tib.* xəstəni sakitləşdirmək üçün təyin edilmiş ziyansız / zərərsiz dərman

**place-brick** [ˈpleɪsbrɪk] *n* yaxşı bişməmiş kərpic

**place-holder** [ˈpleɪs.houldəʳ] *n* vəzifəli şəxs, dövlət qulluqçusu, məmur

**place-hunter** [ˈpleɪs.hʌntəʳ] *n* vəzifəpərəst, mənsəbpərəst, karyerist

**place-hunting** [ˈpleɪs.hʌntɪŋ] *n* vəzifəpərəstlik, mənsəbpərəstlik, karyerizm

**place-kick** [ˈpleɪskɪk] *n id.* sərbəst zərbə, başlanğıc zərbə *(futbol oyununda)*

**placement** [ˈpleɪsmənt] *n* **1.** yerləşdirmə; qoyma; **the** ~ **of the ball** topu qoyma; **the** ~ **of the loan** istiqrazı yayma; **2.** vəzifəyə / işə təyin etmə; **3.** *id.* topu qarşı tərəfin qaytara bilməyəcəyi tərəfə vurma *(tenis oyununda)*; **4.** *id.* yer, məkan *(yarış haq.)*

**place-name** [ˈpleɪsneɪm] *n* coğrafi ad, yer adı

**placenta** [pləˈsentə] *n* *(pl* **placentae** [-tiː] *və ya* **placentas)** *anat.* son, cift

**placentae** [pləˈsentiː] *n* **placenta** *isminin cəm forması*

**placid** [ˈplæsɪd] *adj* sakit, dinc, ahəstə, aram; rahat; ~ **temperament** sakit xarakter; ~ **smile** ahəstə / sakit təbəssüm; **the** ~ **surface of the lake** gölün sakit səthi

**placidity** [plæˈsɪdɪtɪ] *n* sakitlik, dinclik, rahatlıq, aramlılıq, ahəstəlik

**placidly** ['plə'sıdlı] *adv* sakitcə, sakit bir tərzdə, dinc, ahəstə; *Cows were placidly munching grass İnəklər sakitcə / aramla göy otu gövşəyirdilər*

**placing** ['pleısıŋ] *n* **1.** yerləşdirmə, qoyma; **an agreeable ~ of statues** heykəlin qəşəng yerləşdirilməsi; **2.** yer; **the wrong ~ of the article** artiklin yanlış yeri

**plagiarism** ['pleıdʒjərızm] *n* plagiat, ədəbi oğurluq; **to suspect of ~** ədəbi oğurluqdan / plagiatdan şübhələnmək

**plagiarist** ['pleıdʒjərıst] *n* plagiator, ədəbi oğru

**plagiarize, -ise** ['pleıdʒjəraız] *v* plagiatla / ədəbi oğurluqla məşğul olmaq

**plagium** ['pleıdʒjıəm] *n hüq.* adam oğurlama

**plague**[1] [pleıg] *n* **1.** *(həm də* **the ~***) tib.* taun, vəba; **an outbreak of ~** taunun/ vəbanın başlanması; **Siberian ~** qara yara; **2.** fəlakət, bəla, cəza; **a ~ of rats** siçovulların bəlası *(hücumu)*; **3.** *d.d.* pis hadisə/iş, pis/acı xəbər; bezdirmə; narahatlıq; **a ~ of flies** milçəklərin törətdiyi narahatlıq; *Mosquitoes are the plague of our life here Burada ağcaqanadlar bizə rahatlıq vermir/bizi bezdirir*

**plague**[2] [pleıg] *v d.d.* əziyyət / əzab vermək, üzmək; təngə gətirmək, usandırmaq, bezar etmək, cana gətirmək; **to ~ *smb.* with questions** bir kəsi suallarla cana gətirmək / bezar etmək; **to ~ *smb.'s* life out** bir kəsin həyatını zəhərləmək; *I cannot be plagued with this child any longer Bu uşaq məni cana gətirib, daha dözə bilmirəm*

**plague-rat** ['pleıgræt] *n* taun siçovulu, taunyayan siçovul

**plaice** [pleıs] *n zool. (cəmdə dəyişmir)* kambala; qalxan balığı

**plaid** [plæd] *n* **1.** pled *(böyük yun şal)*; **2.** şotlandka *(iri xanalı parça növü)*

**plaided** [plædıd] *adj* **1.** şala bürünmüş; **2.** dama-dama; **~ dress** dama-dama paltar / geyim

**plaiding** ['plædıŋ] *n* **1.** iri şal üçün material; **2.** dama-dama parça, şotlandka *(iri xanalı parça növü)*

**plain**[1] [pleın] *n* düzənlik, düzəngah, düzən, düz *(yer)*; **in the open ~** açıq düzənlikdə / düzəngahda; **Salisbury Plain** Solsberi düzənliyi

**plain**[2] [pleın] *adj* **1.** *(müq. dərəcəsi:* **-er**; *üst. dərəcəsi:* **-est**) aydın; açıq, parlaq; **~ view / sight** açıq görünüş / mənzərə; *All was plain to see Hər şey aydın görünürdü; The rippling of the brook was plain to be heard Çayın şırıltısı açıqca / aydınca eşidilirdi*; **~ articulation** aydın artikulyasiya *(müəyyən səs çıxartmaq üçün danışıq üzvlərinin gördüyü iş)*; **2.** aşkar, açıqdan-açığa, şübhəsiz; *It is his plain duty Bu, şübhəsiz onun birbaşa borcudur; It was plain that he didn't wish to do it Şübhə yox idi ki, o bunu etmək istəmirdi*; **3.** səhih, aydın, anlaşılan; *The meaning is quite plain Məna tamamilə aydındır*; **to make *smth.* ~ to *smb.*** bir şeyi bir kəsə aydınlaşdırmaq; *Tell him what you want in plain words Nə istədiyini / istədiyinizi ona səhih sözlərlə danış / danışın*; **4.** sadə; adi, saf, təmiz, bəsit; **~ dress/furniture** sadə paltar/ mebel; **~ food** sadə / adi ərzaq; **~ water** təmiz / saf su; **~ bread and butter** ancaq yağ və çörək; **a cup of ~ black coffee** bir fincan adi qəhvə; **5.** saya, naxışsız; **~ blue material** saya mavi parça; **~ silk / velvet** saya ipək / məxmər; **~ wall-paper** saya divar kağızı; **6.** sadə, tanınmamış; **a ~ man** adi adam; **~ country-folk** adi / sadə kənd adamları; **7.** açıq, aşkar; **~ statement** açıq / aşkar bəyanat; **~ answer** səmimi / açıq cavab; **8.** sığallı, düz *(saç)*; **9.** birrəngli, naxışsız; **~ drawing** rəngsiz şəkil; **to be ~ with *smb.*** həqiqəti bir kəsin üzünə demək; bir kəslə açıq olmaq; **10.** çirkin, kifir, yaraşıqsız; **a ~ face** çirkin sifət;

◊ **~ Jane** çirkin qız; **in ~ English** anlaşılan ingiliscə; *He can't understand plain English O, ingiliscə sadə sözləri başa düşə bilmir*; **~ as the day / as daylight /as the sun at noonday** gün kimi aydın, tamamilə aydın

**plain**[3] [pleın] *adv* aydın, açıq, aşkar, aydın / açıq bir tərzdə; *That is just plain stupid Bu, aşkar axmaqlıqdır*

**plain-hearted** ['pleın'ha:tıd] *adj* sadədil, ürəyiaçıq, hiyləsiz, təmizürəkli, açıqürəkli, səmimi, safürəkli, biclik bilməyən

**plainly** ['pleınlı] *adv* açıq, açıq-aydın, apaçıq; *The mountain tops are plainly visible from the village Kənddən dağın zirvələri açıq-aydın görünür*

**plainness** ['pleınnıs] *n* **1.** sadəlik, bəsitlik; aydınlıq, açıqlıq, anlaşılma; **~ of style** üslubun sadəliyi/aydınlığı; **2.** ürəyiaçıqlıq, səmimilik, səmimiyyət; *My plainness of speech makes them hate me Açıq danışdığıma görə onlar mənə nifrət edirlər /məni sevmirlər*; **3.** çirkinlik, kifirlik; yaraşıqsızlıq

**plainsman** ['pleınzmən] *n (pl* **-men** [-mən]) düzənlikdə yaşayan, düzənlik sakini

**plain-speaking** ['pleın'spi:kıŋ] *n* söhbətin açıqlığı / səmimiliyi; açıqlıq, düzlük

**plain-spoken** [ˌpleın'spoukən] *adj* açıq, səmimi; açıq / səmimi danışan; **~ way of speaking** açıq /səmimi danışıq tərzi

**plaintiff** ['pleıntıf] *n hüq.* iddiaçı, tələbkar; iddia / tələb edən; **~ in cross** qarşılıqlı iddiaçı; **judgement given for the ~** iddiaçının xeyrinə verilən qərar; **to find for the ~** iddiaçının xeyrinə qərar çıxartmaq; *The jury found for the plaintiff Məhkəmə iddiaçının xeyrinə qərar çıxartdı*

**plaintive** ['pleıntıv] *adj* qəmli, kədərli, dərdli, qüssəli; **a ~ song** qəmli / qüssəli nəğmə; **~ voice** qəmli / kədərli səs; **a ~ cry** fəryadlı qışqırıq

**plaintively** ['pleıntıvlı] *adv* qəmli, kədərli; qəmgin-qəmgin, həzin-həzin, kədərlə, kədərli-kədərli, hüznlə

**plaintiveness** ['pleıntıvnıs] *n* qəm, kədər, qüssə, qəmlilik, kədərlilik, qüssəlilik



**plait**[1] [plæt] *n* **1.** hörük; **girl with long ~s** uzunhörüklü qız; **to wear *one's* hair in ~s / in a ~** saçlarını hörmək; **2.** hörmə; toxunma; **~ of onions** soğan hörməsi / asması

**plait**[2] [plæt] *v* **1.** hörmək *(saçı və s.)*; toxumaq; **to ~ *one's* hair** saçını hörmək; *Mother plaited the little girl's hair Ana balaca qızın saçını hördü; The children learnt to plait little baskets Uşaqlar balaca səbətlər hörməyi öyrəndilər*; **2.** burmaq *(xəmiri)*

**plaited** ['plætıd] *adj* hörülmüş, hörmə; burulmuş; **a ~ belt** hörmə kəmər / toqqa; **~ hair** hörülmüş saç; **~ pastry** burulmuş xəmir

**plan**[1] [plæn] *n* **1.** plan; **a development ~** inkişaf planı; **a ~ for producing energy** enerji istehsal etmək üçün plan; **a carefully worked-out ~** yaxşı düşünülüb tutulmuş plan; **to draw a ~** plan tutmaq / cızmaq; **to work out a ~** plan hazırlamaq; *The police worked out a plan to catch the thief Oğrunu tutmaq üçün polis plan hazırladı; Everything went according to plan Hər şey plana uyğun getdi*; **to upset *smb.'s* ~** bir kəsin planını pozmaq / alt-üst etmək; *What are your plans for tomorrow? Sabaha planın / planınız nədir?* **2.** çertyoj, diaqram, sxem; **working ~** işçi çertyoju; **3.** məram, məqsəd; niyyət, istək, fikir; **to change ~** məramını / niyyətini / fikrini dəyişmək

**plan**[2] [plæn] *v* **(-nn-) 1.** plan tutmaq / cızmaq, planlaşdırmaq; **to ~ a piece of work** işi planlaşdırmaq; **to ~ everything ahead** hər şeyi əvvəldən planlaşdırmaq; **2.** fikrində/niyyətində olmaq, nəzərdə tutmaq; *We have planned for him to stop till tomorrow Biz nəzərdə tutmuşuq ki, o sabaha kimi qalacaq*; **to ~ out** planlaşdırmaq, plana salmaq; **to ~ out *one's* time** vaxtını planlaşdırmaq; *The police planned out a new traffic system for the town Polis şəhər üçün yeni küçə hərəkəti sistemi / qaydası planlaşdırdı*

**plane**[1] [pleın] *n* I **1.** təyyarə; **to travel by ~** təyyarə ilə səyahət etmək; *The plane landed at London Təyyarə Londonda yerə endi*; **2.** yastılıq, düz səth, müstəvi; **the horisontal / vertical ~** üfüqi / şaquli müstəvi; **3.** səviyyə; **to reach a higher ~ of development** inkişafın yüksək səviyyəsinə çatmaq; *They seem to exist on a different spiritual plane Belə görünür ki, onlar mənəvi cəhətdən müxtəlif səviyyələrdədirlər*

**plane** [pleın] *n* II rəndə

**plane** [pleın] *n* III *bot.* çinar, çinar ağacı

**plane**[2] [pleın] *adj* yastı, düz, hamar; **a ~ surface** yastı/hamar səth; **Plane geometry** *riyaz.* planimetriya *(həndəsənin səth üzərindəki fiqurlardan bəhs edən hissəsi)*

**plane**[3] [pleın] *v* I *d.d.* təyyarə ilə uçmaq / gəzmək; **to ~ down** *av.* yerə enmək

**plane** [pleın] *v* II rəndələmək, yonmaq *(taxtanı və s.)*; rəndələyib / yonub hamarlamaq; **to ~ a plank** taxta rəndələmək; **to ~ the surface down** səthi rəndələyib / yonub hamarlamaq; **to ~ *smth.* away / off** rəndələyib aparmaq; **to ~ away / off the bumps on a surface** səthdəki fırları rəndələyib/yonub aparmaq;

◊ **to ~ the way / the path** *arx.* manеəni aradan götürmək

**planet** ['plænıt] *n astr.* planet, səyyarə; **the ~s of the solar system** günəş sisteminin planetləri; **the ~ Venus** Venera planeti / səyyarəsi; **secondary ~** planetlərin peykləri; **major / minor ~s** böyük / kiçik planetlər; *The Earth is a planet Yer planetdir*

**planetaria** [ˌplænı'teərıə] *n* **planetarium** *isminin cəm forması*

**planetarium** [ˌplænıteərıəm] *n (pl* **planetariums** *və ya* **planetaria**) planetari *(ulduzlu göy cisimlərinin hərəkətini göstərən qurğu və bu qurğunun yerləşdiyi bina)*

**planetary** ['plænətrı] *adj* planet, səyyarə; **~ system** planet sistemi; **~ activity** planet fəaliyyəti / fəallığı

**plangent** ['plændʒənt] *adj* kədərli, qəmli; qüssəli; iniltili *(səs haq.)*

**plangently** ['plændʒəntlı] *adv* kədərli-kədərli, qəmli-qəmli, qüssəli-qüssəli, inilti ilə

**plank**[1] [plæŋk] *n* **1.** qalın taxta; **2.** dayaq, söykənəcək; istinad, müdafiə etmə; *This is our only plank Bu bizim yeganə dayağımızdır*; **3.** partiya proqramının bəndi

**plank**[2] [plæŋk] *v* **1.** *tik.* taxta vurmaq, taxta döşəmək *(həm də* **to ~ over**); **2.** *d.d.* qoymaq, yerləşdirmək; tikmək

**planking** ['plæŋkıŋ] *n* **1.** köbə, haşiyə, haşiyə /üz vurma *(taxtadan)*; **2.** *top.i* taxta *(material)*; döşəmə, döşənək *(taxtadan)*

**plankton** ['plæŋktən] *n biol.* plankton *(suda yaşayan və ancaq su cərəyanı qüvvəsi ilə hərəkət edən bitki və ya heyvan orqanizmləri)*

**planned** [plænd] *adj* planlı; **~ production** planlı istehsal

**planner** ['plænəʳ] *n* çizgiçi, çertyojnik; layihəçi *(layihə mütəxəssisi)*; plançı, planlaşdırıcı, plan düzəldən / çəkən

**planning** ['plænıŋ] *n* planlaşdırma; plana salma, plan tərtib etmə/tutma; **long-term ~** perspektiv plan

**plant**[1] [pla:nt] *n* I **1.** bitki; **indoor ~s** otaq bitkiləri; **flowering ~s** çiçəkləyən bitkilər; **garden ~s** bağ bitkiləri; *Plants need light and water Bitkilərə işıq və su lazımdır*; **2.** şitil; **cabbage ~** kələm şitili; **3.** *məc.* təzə işçi / şagird; xam, naşı, təcrübəsiz; **4.** *top.i* məhsul; **the promising ~ of wheat** buğdanın gözlənilən məhsulu; **5.** inkişaf; böyümə, boy atma; **in ~** böyüyən, boy atan, inkişaf edən; **to lose ~** zəifləmək, sısqalaşmaq; solmaq

**plant** [pla:nt] *n* II **1.** zavod, fabrik; *top.i* zavodlar; **2.** təchiz etmə / edilmə; avadanlıq, təchizat, lə-

vazimat; **farming** ~ kənd təsərrüfatı avadanlığı /maşınları; 3. aqreqat *(bir işi görmək üçün bir neçə müxtəlif maşın birləşməsindən ibarət qurğu)*; mexanizm (**1**) *maşının, aparatın və s.-in daxili quruluşu;* **2**) *məc. quruluş, sistem)*

**plant²** [pla:nt] *v* I **1**. basdırmaq, əkmək; **to ~ a tree** ağac basdırmaq / əkmək; **to ~ beans and peas** lobya və noxud əkmək; *We planted beans and peas in the vegetable garden Biz dirrikdə lobya və noxud əkdik*; **2**. sancmaq; yerləşdirmək, qoymaq; **to ~ a standard** bayraq sancmaq; **to ~ a battery on a height** batareyanı yüksəklikdə yerləşdirmək; **to ~ mines** mina qoymaq / yerləşdirmək; **3**. *d.d.* soxmaq, sancmaq, batırmaq; **to ~ a dagger in** ***smb.'s*** **heart** bir kəsin ürəyinə xəncər soxmaq / sancmaq; **4**. endirmək *(zərbə); The blow was well planted Zərbə dəqiq idi*; **to ~ *one's* fist on *smb.'s* nose** yumruğu ilə bir kəsin burnuna zərbə endirmək; **5**. təlqin etmək, inandırmaq, yeritmək *(fikri); The teacher planted this idea in the minds of his pupils Müəllim bu fikri şagirdlərinin beyninə yeritdi*;

◊ **to ~ it home** zərbə vurmaq / endirmək; **to ~ out** əkmək, basdırmaq; **to ~ out tomato seedlings** pomidor şitili basdırmaq

**plantain** [ˈplæntın] *n bot.* bağayarpağı

**plantation¹** [pla:nˈteıʃn] *n* **1**. meşəsalma, ağac əkmə; salınmış meşə sahəsi; **the ~s of Scotland** Şotlandiyanın meşə sahələri; **vast ~s of trees** geniş meşəsalma; **2**. tarla, plantasiya; **tea / cotton / rubber** ~ çay /pambıq /kauçuk plantasiyası; **3**. ağac əkilmiş sahə, meşə; **~s of pine** şamlıq, şam meşəsi

**plantation²** [pla:nˈteıʃn] *adj* plantasiya; **a ~ owner** plantasiya sahibi

**planter** [ˈpla:ntəʳ] *n* **1**. bitki əkən, ağac basdıran; **2**. *k.t.* kartof əkən *(maşın)*, şitil köçürən *(maşın)*; **a strawberry** ~ çiyələk şitili köçürən maşın; **3**. toxumsəpən / səpici maşın; **4**. plantasiyaçı, plantasiya sahibi; **5**. ilk mühacir, bir yerə köçüb yerləşən ilk adam; kolonist, koloniyada yaşayan *(adam)*; **6**. *d.d.* zərbə

**plant-feeder** [ˈpla:nt.fi:dəʳ] *n zool.* otyeyən heyvan

**planting¹** [ˈpla:ntıŋ] *n* əkmə, əkilmə; əkin, səpin

**planting²** [ˈpla:ntıŋ] *adj* **1**. əkmə, basdırma; **~ hole** basdırma / əkmə üçün çala; **~ cord** *k.t.* düz xətlə əkmək / basdırmaq üçün ip; **~ machine** toxumsəpən maşın; **~ spade** *k.t.* əkmək / basdırmaq üçün bel; **~ hatchet** *k.t.* basdırmaq üçün toxa; **2**. toxumluq; **~ potatoes** toxumluq kartof

**planting-bed** [ˈpla:ntıŋˈbed] *n* lək *(əkin üçün)*

**planting-soil** [ˈpla:ntıŋˈsɔıl] *n k.t.* əkin yeri, əkin üçün yararlı yer

**planting-stock** [ˈpla:ntıŋstɔk] *n k.t.* şitil, qələm, ting; əkin materialı

**plant pathology** [ˈpla:ntpəˈθɔlədʒı] *n* fitopatologiya *(bitki xəstəliklərindən bəhs edən elm)*

**plant-setter** [ˈpla:nt.setəʳ] *n* şitiləkən/şitilbasdıran maşın

**plap** [plæp] *v* şappıldatmaq, döymək, tıqqıldatmaq; vurmaq, döyünmək *(ürək və s.)*

**plaque** [pla:k] *n* **1**. üstünə ad, soyadı, müəssisənin adı və s. yazılan lövhə; **memorial ~** xatirə lövhəsi; **2**. nişan, şərəf nişanı; **3**. yastı broşka *(bəzək sancağı)*; **a ~ of diamonds and emeralds** brilyant və zümrüdlə bəzədilmiş yastı broşka; **4**. *tib.* səpmə ləkəsi, sızanaq

**plash¹** [plæʃ] *n* I **1**. şappıltı, şıppıltı, şırpıltı; **the ~ of oars** avarların şappıltısı; **the ~ of waves** dalğaların şıppıltısı; **2**. işıq ləkəsi; **like ~es of sunlight** günəş ləkəsi kimi *(inikas edən günəş şüalarından şeyin üzərinə düşən parlaq ləkə kimi)*

**plash** [plæʃ] *n* II bataqlıq, gölməçə, nohur

**plash²** [plæʃ] *v* I **1**. şappıldatmaq, şıppıldatmaq; **2**. sıçratmaq, tökmək *(suyu)*, **3**. ləpələnmək; şappıltı ilə döymək, sıçramaq, tökülmək *(su)*; **to ~ through water / through mud** suyun / palçığın içi ilə şappıldada-şappıldada yerimək / getmək; *The fish was jumping and plashing Balıq sıçrayır və suyu şappıldadırdı*; **4**. *tik.* sıçratma üsulu ilə divarı rəngləmək / boyamaq

**plash** [plæʃ] *v* II çubuqla hörmək, çubuqdan çəpər hörmək

**plashing** [ˈplæʃıŋ] *n* I **1**. şappıldatma, şappıldama; şappıltı, şırıltı; sıçratma *(suyu)*; **2**. *tik.* divarı sıçratma yolu ilə boyama / rəngləmə

**plashing** [ˈplæʃıŋ] *n* II **1**. hörmə; **2**. hörmə çəpər

**plashy** [ˈplæʃı] *adj* I şarıldayan, şırıldayan, şarıltı ilə tökülən; **~ waterfalls** şarıltı ilə tökülən şəlalələr

**plashy** [ˈplæʃı] *adj* II bataqlı, batlaq; nohurlu, gölməçəli; **~ roads** bataqlı / nohurlu yollar

**plasm** [plæzm] *n* = **plasma**

**plasma** [ˈplæzmə] *n* **1**. *biol.* plazma *(orqanik toxumaların – qanın, limfanın maye tərkib hissəsi)*; **2**. *fiz.* plazma; **3**. tünd-yaşıl rəngli mineral

**plaster¹** [ˈpla:stəʳ] *n* **1**. *tik.* suvaq, mala; **2**. plastır *(məlhəm)*; **3**. ağrıkəsən dərman; **a ~ for all sores** bütün dərdlərin dərmanı

**plaster²** [ˈpla:stəʳ] *v* **1**. *tik.* malalamaq, suvaqlamaq; mala/suvaq çəkmək; **2**. ört-basdır etmək; malalamaq; **to ~ a quarrel** bir təhər razılaşmaq/barışmaq; **3**. bulamaq, bulaşdırmaq, çirkləndirmək, ləkələmək, batırmaq; *He was plastered over with mud O bütünlüklə palçığa bulanmışdı*; **4**. yapışdırmaq; **to ~ an advertisement on the wall** divara elan yapışdırmaq; **5**. *məc.* qabacasına yaltaqlanmaq / yaltaqlıq etmək *(həm də* **to ~ over, to ~ up**); *He plastered them with praise to be similarly plastered in turn O onlara qaba şəkildə yaltaqlandı ki, onlar da ona eyni şəkildə yaltaqlansınlar*; **6**. plastır qoymaq; **7**. *məc.* ağrını azaltmaq, sakitləşdirmək; **8**. həddindən artıq bəzəmək; *She was plastered with diamonds O, brilyantla həddindən artıq bəzənmişdi*; **9**. bərkimək; *The soil plastered like stone Torpaq daş kimi bərkimişdi*



**plasterer** [ˈpla:stərəʳ] *n* malakeş, suvaqçı

**plastering** [ˈpla:stərıŋ] *n tik.* mala işi, suvaqlama, malakeşləmə; malalama, suvaqlama; suvaq, mala

**plaster of Paris** [ˈpla:stərəvˈpærıs] *n* gips

**plastery** [ˈpla:stərı] *adj* **1**. suvaşqan, yapışqan; **2**. gipsəbənzər, gips kimi

**plastic¹** [ˈplæstık] *n* plastik kütlə, plastmas; *Plastic is often used instead of leather Plastik kütlə tez-tez dəri əvəzinə işlədilir*

**plastic²** [ˈplæstık] *adj* plastik; **a ~ bag / bucket / spoon** plastik torba / vedrə / qaşıq; *Clay is a plastic substance Gil plastik maddədir*

**plastically** [ˈplæstıkəlı] *adv* plastik bir tərzdə / surətdə; çevikliklə, zirəkcəsinə

**plasticity** [ˈplæstısıtı] *n* **1**. plastiklik, elastiklik, asanlıqla əyilmə qabiliyyəti; **2**. zirəklik, çeviklik

**plastic surgeon** [.plæstıkˈsə:dʒən] *n* plastik cərrahiyyə aparan həkim

**plastic surgery** [.plæstıkˈsə:dʒərı] *n* plastik cərrahiyyə

**plate¹** [pleıt] *n* **1**. boşqab, nimçə; **a dinner ~** dayaz boşqab; **a soup ~** dərin boşqab; **2**. *d.d.* xörək; **fish ~** balıq xörəyi; **3**. gümüş və ya qızıl qab-qacaq; *The plate is kept in locked cupboard Qızıl və gümüş qab-qacaq qıfıllı şkafda saxlanılır*; **4**. sal; pilətə; təbəqə; **5**. lövhə, lövhəcik *(üstünə sahibinin adı, soyadı yazılaraq qapıya vurulan)*; **a brass ~** bürünc lövhə; **a name ~** üstünə ad yazılmış lövhəcik; **6**. *d.d. amer.* dəblə geyinmiş qəşəng qadın; **7**. *id.* priz olaraq verilən kubok *(xüs. cıdırda)*;

◊ **~s and dishes 1**) arvad, zövcə; **2**) öpüş; **to have too much on *one's* ~** çox / boğaza qədər işi olmaq

**plate²** [pleıt] *v* üz çəkmək / vurmaq *(taxtadan, dəmirdən və ya başqa metaldan); The ring was only plated with gold Üzüyə ancaq qızıldan üz çəkilmişdi; The spoon was plated with silver Qaşığa gümüşdən üz çəkilmişdi, Qaşıq gümüş suyuna çəkilmişdi*

**plate-bone** [ˈpleıtboun] *n anat.* kürək, kürək sümüyü

**plateful** [ˈpleıtful] *n (pl* **-fuls**) bir boşqab, boşqab dolusu; **to eat a ~ of soup** bir boşqab şorba / sup yemək; *He ate two platefuls of soup O, iki boşqab (dolusu) sup / şorba yedi*

**platform¹** [ˈplætfɔ:m] *n* **1**. platforma, hündür səki, meydança *(dəmir yolunda və s.); From what platform does the train start? Qatar hansı platformadan yola düşür?; Your train is waiting at platform 5 Sənin / Sizin qatarın / qatarınız 5-ci platformadadır*; **2**. tribuna, xitabət kürsüsü; *This question could be brought upon the platform Bu məsələ müzakirəyə çıxardıla bilərdi*; **to be on the ~** rəyasət heyətində olmaq; **3**. siyasi platforma; **common ~** ümumi platforma, seçkiqabağı platforma; **4**. meydança *(tramvayda, avtobusda, dəmiryol vaqonunda və s.); No standing on the platform Meydançada durmaq/dayanmaq olmaz*;

◊ **to have a good ~ manner** yaxşı natiq olmaq; **to quit the ~** açıq çıxışdan imtina etmək

**platform²** [ˈplætfɔ:m] *v* xitabət kürsüsündən çıxış etmək

**platinum** [ˈplætınəm] *n kim.* platin *(ağ qızıl)*

**platonic** [pləˈtɔnık] *adj* **1**. platonik; mücərrəd, heç vaxt həyata keçməyən; **~ love** platonik sevgi; **2**. *d.d.* nəzəri, mücərrəd

**plausibility** [.plɔ:zəˈbılıtı] *n* doğruya oxşarlıq, həqiqətə uyğunluq, ehtimal, mümkünlük, yəqinlik; *There is little plausibility in her explanation Onun izahatında bir az həqiqətə uyğunluq var*

**plausible** [ˈplɔ:zəbl] *adj* **1**. doğruya oxşayan, həqiqətə uyğun, inanılacaq, ağılkəsən; mümkün ola bilən, ehtimal edilən, ağlabatan; *It's quite a plausible reason Bu tamamilə ağlabatan səbəbdir*; **2**. münasib, ləyaqətli; **~ excuse** üzürlü·bəhanə

**play¹** [pleı] *n* **1**. oyun, əyləncə; **boy's ~s** oğlan oyunları; *Children are fond of play Uşaqlar oyunu çox sevirlər*; **to be at ~** oynamaq, oyunda olmaq; **the happy sounds of children at ~** oynayan uşaqların sevinc səsləri; **in ~** *id.* oyunda; *The ball is in play Top oyundadır;* **out of ~** *id.* oyundan kənar; **to go out of ~** oyundan çıxmaq; *The ball went out of play Top oyundan çıxdı; Rain prevented any further play in the match Yağış oyunun davam etməsinə imkan vermədi*; **2**. oynama / oyun tərzi; **rough ~** kobud oyun; **pretty ~** gözəl / qəşəng oyun; **to win a match by good ~** yarışı yaxşı oyun hesabına udmaq; **3**. *id.* güləşmə, qurşaq tutma; döyüş; **4**. qumar *(oyun)*; **to loose money at ~** qumar oyununda pul uduzmaq; **5**. zarafat, hənək; **in ~** zarafatla, zarafatyana; **to say *smth.* in ~** bir şeyi zarafatyana demək; *He answered my question part in earnest and part in play O mənim sualıma yarı ciddi, yarı da zarafatyana cavab verdi*; **6**. pyes, tamaşa; **the ~s of Shakespeare** Şekspirin pyesləri; **7**. hərəkət; **a child full of ~** diribaş/ çevik / zirək uşaq; **8**. bərq vurma, rəngdən-rəngə çalma; **the ~ of sunlight upon leaves / water** günəş şüalarının yarpaqlar / su üzərində bərq vurması; **the ~ of the diamond** brilyantın bərq vurması; **9**. hərəkət, fəaliyyət; **in full ~** qızğın çağda / vaxtda; *The usual bustle was in full play Adəti üzrə olan hərc-mərclik qızğın çağında idi*; **to come into ~** hərəkət etməyə başlamaq; **to bring / to call into ~** hərəkətə gətirmək, işə salmaq; **to bring the guns into ~** topları işə salmaq; **10**. *av.* narahat uçuş, yırğalanma;

◊ **fair ~ 1**) qaydaya müvafiq / uyğun oyun; **2**) düz / vicdanlı oyun; **foul ~ 1**) şərəfsiz oyun; **2**) yalan; fırıldaq, kələk, fırıldaqçılıq, kələkbazlıq; cinayət; **to keep / to hold *smb.* in ~ 1**) bir kəsi işlə həddindən artıq yükləmək, bir kəsə dincəl-

məyə imkan verməmək; 2) *id.* rəqibi gərginlikdə/gərgin vəziyyətdə saxlamaq; rəqibə nəfəs almağa imkan verməmək

**play[2]** [pleı] *v* **1.** oynamaq, oynaqlaşmaq, gülüb oynamaq, əylənmək; *Our cat is playing with a ball Pişiyimiz topla oynayır; The children are playing in the yard Uşaqlar həyətdə oynayırlar; My daughter can play by herself for hours Mənim qızım saatlarla öz-özü ilə oynaya bilir*; **2.** zarafat etmək; **to ~ a joke / a prank on *smb.*** bir kəslə zarafat etmək; **3. (with)** mazaqlaşmaq, eşqbazlıq etmək; naz / işvə satmaq; **4.** oynamaq, oyunda iştirak etmək; **to ~ (at) tennis / hockey / chess/ cards** tennis / hokkey / şahmat / kart oynamaq; **to ~ a game of tennis / chess / cards,** *etc.* bir əl tennis / şahmat / kart *və s.* oynamaq; **to ~ for championship** çempionatda iştirak etmək; **to ~ *smb.* at chess** bir kəslə şahmat oynamaq; **to ~ at robbers** quldur-quldur oynamaq; **5.** gediş etmək, oynamaq; **to ~ white / black** *şahm.* ağ / qara fiqurla oynamaq; **to ~ a pawn** piyada ilə oynamaq; **6.** hiylə / riyakarlıq etmək; yalandan özünü …göstərmək / …qoymaq; **to ~ the fool** özünü gicliyə / axmaqlığa qoymaq; **7.** hərəkət etmək, özünü aparmaq; **to ~ the man** özünü kişi kimi aparmaq; **to ~ fair** namusla hərəkət etmək; **to ~ foul / foully** kələkbazlıq / biclik etmək, fırıldaq / kələk işlətmək; **8.** oyun üçün münasib / yararlı olmaq; yaxşı vəziyyətdə olmaq; *The ground plays well İdman meydançası əla vəziyyətdədir; This piano plays well Royal yaxşı vəziyyətdədir*; **9.** ifa etmək *(musiqi əsərini və s.)*, oynamaq *(rol)*; **to ~ a part** rol oynamaq; **to ~ in a film** filmdə oynamaq; **10.** çalmaq *(musiqi alətində)*; **to ~ the piano / the violin / the tar / the saz,** *etc.* royal / skripka / tar/saz *və s.* çalmaq; **11.** tamaşa vermək; tamaşaya qoymaq; **to ~ a tragedy** tamaşaya faciə qoymaq; *An old comedy is being played again Köhnə komediyanı yenidən tamaşaya qoyublar*; **12.** fırlatmaq, oynatmaq; **to ~ with *one's* stick** əl ağacını oynatmaq / fırlatmaq; **13.** uçmaq, uçuşmaq; *Butterflies were playing among the flowers Kəpənəklər güllərin arasında uçuşurdular*; **14.** bərq vurmaq, parlamaq; *Lightning played in the sky Şimşək səmada parladı*; **15.** istiqamətləndirmək, salmaq *(şüanı)*; **to ~ a searchlight upon a boat** projektorun şüasını qayığın üstünə salmaq / istiqamətləndirmək; **16. (upon)** atəşə tutmaq; **to ~ guns upon the fort** istehkamı toplardan atəşə tutmaq; **to ~ bullets upon *smb.*** bir kəsi gülləyə basmaq; **17.** işə salmaq *(həm də* **to ~ off**); *The engine was played off Mühərriki işə saldılar*; **to ~ about** *d.d.* pulu sağa-sola xərcləmək / göyə sovurmaq; **to ~ around** *d.d.* **1)** məhəbbət macərasına başlamaq; **2)** bir yastığa baş qoymaq; **to ~ away 1)** uduzmaq *(kartda)*; **2)** itirmək; dağıtmaq, məhv etmək; **to ~ away *one's* youth** gəncliyini itirmək / məhv etmək; **to ~ down** *d.d.* **1)** azaltmaq; kiçiltmək, əhəmiyyət verməmək; **to ~ down difficulties** çətinliyi azaltmaq / kiçiltmək, çətinliyə əhəmiyyət verməmək; **2)** yaltaqlıq etmək, qılığına girmək;

◊ **to ~ upon words** cinasla danışmaq; **to ~ a trick on *smb.*** bir kəsi aldatmaq, bir kəsə kələk / fırıldaq gəlmək; **to ~ tricks with** qarışmaq və korlamaq *(bir işi)*; **to ~ the devil / the deuce** ziyan / zərər vermək; **to ~ *one's* cards well** imkanlarından məharətlə istifadə etmək; **to ~ fast and loose** məsuliyyətsiz hərəkət etmək; **to ~ for time** vaxt udmağa çalışmaq

**play-bill** [ˈpleıbıl] *n* teatr elanı / proqramı

**play-book** [ˈpleıbuk] *n* pyeslərin toplusu, ayrıca kitab halında nəşr edilmiş pyeslər

**play-boy** [ˈpleıbɔı] *n amer. d.d.* **1.** avara, veyl, tənbəl *(adam)*; **2.** *amer.* gənc aktyor; **3.** gününü kefdə / eyş-işrətdə keçirən dövlətli adam

**player** [ˈpleıəʳ] *n* **1.** oyunçu; **a game for four ~s** dörd oyunçu ilə oynanılan oyun; *She's an excellent tennis player O, əla tennis oynayır / oyunçusudur*; **2.** çalğıçı; **a trumpet ~** truba çalan; **3.** *arx.* aktyor; **amateur ~s** həvəskar aktyorlar; **4.** qumarbaz; **5.** qeyri-ciddi adam

**playfellow** [ˈpleıˌfelou] *n* uşaqlıq oyun yoldaşı

**playful** [ˈpleıfl] *adj* **1.** oynaq, şux, şən; nadinc, dəcəl; **a ~ kitten** oynaq pişik balası; **to be in a ~ mood** şən ovqatda olmaq; **2.** zarafat; **~ words** zarafatyana sözlər

**play-game** [ˈpleıgeım] *n* **1.** uşaq oyuncaqları; **2.** cəfəngiyyat, boş şey

**playgoer** [ˈpleıˌgouəʳ] *n* teatr həvəskarı, teatra çox gedən adam

**playground** [ˈpleıˌgraund] *n* idman meydançası

**playing-card** [ˈpleıŋka:d] *n* oyun kartı

**playing-field** [ˈpleıŋfi:ld] *n id.* oyun meydanı/meydançası *(futbol və s. üçün)*; **a game of football on the school ~** məktəbin meydançasında futbol oyunu

**playmate** [ˈpleımeıt] *n* = **playfellow**

**play-off** [ˈpleıɔf] *n id.* həlledici oyun

**playroom** [ˈpleırum] *n* uşaqlar üçün oyun otağı

**plaything** [ˈpleıθıŋ] *n* oyuncaq *(həm də məc.)*; **a ~ of fortune** taleyin əlində oyuncaq

**playtime** [ˈpleıtaım] *n* **1.** istirahət vaxtı; **2.** *amer.* tamaşanın başlanğıcı

**playwright** [ˈpleıraıt] *n* dramaturq

**plea** [pli:] *n* **1.** *müttəhimin və ya məhkəmə qarşısında cavabdehin bəyanatı, yaxud onun adından verilmiş bəyanat*; **defendant's ~** müttəhimin / cavabdehin müdafiəsi üçün çıxış *(məhkəmədə)*; **~ of guilty** özünün günahkar olduğunu etiraf etmə; **2.** etiraz; **~ to the jurisdiction** məhkəmə yurisdiksiyasına etiraz; **to put in a ~** ʼdiaya qarşı məhkəməyə etiraz təqdim etmək; **3.** *hüq.* işi məhkəməyə vermə; **4.** bəraət; əsaslanma; **5.** müraciət, çağırış, xahiş, rica; yalvarış, yalvarma; **~ for mercy** əfv edilmə üçün müraciət / xahiş; **~ for aid** kömək üçün yalvarma; **~ for money** pul üçün xahiş / yalvarma



**plead** [pli:d] *v (pt, pp* **pleaded**; *amer.* **pled** [pled]) **1. (with)** çağırmaq *(köməyə və s.)*; xahiş etmək, yalvarmaq; **to ~ with *smb.* for *smth.*** bir kəsdən bir şeyi xahiş etmək, bir şey üçün bir kəsə yalvarmaq; *The girl pleaded him not to leave her Qız ondan xahiş etdi ki, / ona yalvardı ki, onu tərk etməsin*; **2.** *hüq.* məhkəmədə çıxış etmək, müttəhimi müdafiə etmək; **to ~ *smb.'s* cause 1)** məhkəmədə bir kəsin işini aparmaq; **2)** bir kəsin marağını müdafiə etmək *(məhkəmədə)*; *He was not allowed to plead his cause Ona marağını müdafiə etməyə icazə vermədilər*; **to ~ *one's* good faith** öz düzgünlüyünü / təmizliyini sübut etmək; **3.** iddia üzrə etiraz etmək *(məhkəmə yolu ilə)*; **4.** əsaslanmaq; bəhanə gətirmək; **to ~ difficulties in regard to *smth.*** bir şeydə çətinlikləri bəhanə gətirmək; **5.: to ~ guilty** özünü günahkar hesab etmək, günahkar olduğunu etiraf etmək

**pleader** [ˈpli:dəʳ] *n* **1.** məhkəmədə çıxış edən vəkil; **2.** *məc.* müdafiəçi; vəkil; **the ~ of a good cause** ədalətli işin müdafiəçisi

**pleading[1]** [ˈpli:dıŋ] *n* **1.** tərəflərin və ya vəkilin məhkəmədə çıxışı; **2.** havadarlıq, tərəfgirlik; himayə; xahiş, ərizə; yalvarış, yalvarma

**pleading[2]** [ˈpli:dıŋ] *adj* yalvaran; yalvarıcı, yalvarış ifadə edən; **~ tone / look** yalvarış ifadə edən səs / baxış

**pleadingly** [ˈpli:dıŋlı] *adv* yalvarıcı bir tərzdə, yalvara-yalvara; **to speak ~** yalvarıcı bir tərzdə danışmaq

**pleasant** [ˈpleznt] *adj (müq. dərəcəsi:* **-er**; *üst. dərəcəsi:* **-est**) xoş, xoşagələn, xoşagedən, sevindirici, ləzzətli; gözəl, qəşəng, məlahətli, sevimli; çox yaxşı; **~ breeze / perfume** xoş meh / ətir; **a ~ evening** gözəl / qəşəng axşam; **a ~ smile** xoş / xoşagələn təbəssüm; *It's a pleasant day for walking Gəzmək üçün qəşəng gündür; It's pleasant to see you Səni / Sizi görmək xoşdur*; **a flower with a ~ smell** xoş ətirli / iyli çiçək

**pleasantly** [ˈplezntlı] *adv* xoş, yaxşı, gözəl; **to look ~** yaxşı görünmək; **to speak ~** yaxşı / xoş danışmaq

**pleasantness** [ˈplezntnıs] *n* yaxşılıq, gözəllik, xoşagəlimlilik, xoşa gəlmə; sevimlilik

**pleasantry** [ˈplezntrı] *n* zarafatcıllıq; zarafat; **silly ~** axmaq/sarsaq zarafat; *They exchanged pleasantries for a few minutes before saying goodbye Sağollaşmazdan əvvəl onlar zarafat etdilər / zarafatlaşdılar*

**please** [pli:z] *v* **1.** razı etmək / salmaq; **to ~ *smb.*** bir kəsi razı salmaq; *It's difficult to please everybody Hamını razı salmaq çətindir; Our main aim is to please the customers Bizim əsas məqsədimiz müştəriləri razı salmaqdır*; **2.** istəmək; *I'll do as I please Mən istədiyim kimi edəcəm; Do as you please Necə istəyirsən / istəyirsiniz, elə də et / edin; Let him say what he pleases Qoy / Qoyun o nə istəyir desin; Please! Buyur! / Buyurun!; Please not to interrupt me! Zəhmət olmasa, mənim sözümü kəsmə! / kəsməyin!; Please tell me the time Zəhmət olmasa, vaxtı mənə de / deyin*; **3.** xoşa gəlmək, razı salmaq, ürəyə yatmaq, bəyənilmək; *Nothing pleases him Heç nə onun xoşuna gəlmir, O heç nəyi bəyənmir*;

◊ *Please yourself Necə istəyirsən / istəyirsiniz; –I don't want to go for a walk, –Please yourself –Mən gəzməyə getmək istəmirəm, –Necə istəyirsən / istəyirsiniz*

**pleased** [pli:zd] *adj* **1. (with)** razı, razılıq bildirən, məmnun; **a ~ smile** razılıq bildirən təbəssüm; *Mother will be pleased with you Anan / Ananız səndən / sizdən razı qalacaq; Are you pleased with your new job? Təzə işindən / işinizdən razısanmı? / razısınızmı?; I'm pleased with you Mən səndən / sizdən razıyam*; **2.: ~ to do *smth.*** bir şeyi etməkdən məmnun/razı; *I was very pleased to be able to help Mən kömək etdiyimi bacardığım üçün çox məmnun idim; We were pleased to hear the news Xəbəri eşitdiyimizə görə biz məmnun idik; I'm pleased to meet you Səni / Sizi gördüyümə şadam / məmnunam*

**pleasing** [ˈpli:zıŋ] *adj* xoş, xoşagələn, xoşagedən, zövqverən, ləzzətli, gözəl, qəşəng, məlahətli; **~ memory** xoş xatirə; **~ view** gözəl mənzərə; **~ voice** məlahətli səs; **~ music** zövqverən / xoşagələn musiqi; *The results are pleasing to both of us Nəticə hər ikimiz üçün xoşagələndir*

**pleasingly** [ˈpli:zıŋlı] *adv* yaxşı, qəşəng, xoşa gələcək bir tərzdə / surətdə

**pleasurable** [ˈpleʒərəbl] *adj* xoş, yaxşı, zövqverən; **~ sensation** xoş / zövqverən hiss / duyğu

**pleasure[1]** [ˈpleʒəʳ] *n* **1.** həzz, zövq, ləzzət, kef; **to take *one's* ~** kef çəkmək; həzz / ləzzət almaq; əylənmək; **a place with no opportunities for ~** heç bir kef çəkmək / əylənmək imkanı olmayan yer; **to take / to find / to derive ~ in doing *smth.*** bir şeyi etməkdən həzz / zövq almaq; **to do *smb.* a ~** bir kəsə ləzzət/zövq vermək; **2.** məmnuniyyət; **with great ~** böyük məmnuniyyətlə; **with the greatest (of) ~** çox böyük məmnuniyyətlə

**pleasure[2]** [ˈpleʒəʳ] *v* kef / zövq vermək; **to ~ *smb.*** bir kəsə kef vermək; *I'll do anything to pleasure you Sənə / Sizə kef vermək üçün mən əlimdən gələn hər şeyi edəcəm*

**pleasure boat** [ˈpleʒəbout] *n* gəzinti üçün qayıq, gəzinti qayığı

**pleasure ground** [ˈpleʒəgraund] *n* oyun və əyləncə meydanı/meydançası

**pleat[1]** [pli:t] *n* bükük, büzmə, qırçın; **a shirt with**

**narrow ~s at the front** qabağında xırda qırışları / büzmələri olan köynək

**pleat²** [pli:t] *v* büzmələmək, qırçınlamaq

**pleated** ['pli:tıd] *adj* qırçınlı, büzməli; **a ~ skirt** büzməli / qırçınlı yubka

**pleater** ['pli:təʳ] *n* **1.** qırçınlayan / büzmələyən *(adam)*; **2.** qırçınlama / büzmələmə maşını

**pledge¹** [pledʒ] *n* **1.** girov; **to put in ~** girov qoymaq; **2.** *məc.* rəhn; **a ~ of fidelity / friendship** sədaqətin / dostluğun rəhni; **a ~ of love** məhəbbətin rəhni, uşaq; **3.** əhd-peyman, vəd, and, söz vermə; **to make secret ~s** gizli vəd vermək, əhd-peyman etmək; **to give a ~ never to reveal the secret** sirri açmamağa söz vermək; **to keep *one's* ~** əhd-peymanına / vədinə sadiq olmaq; **to carry out *one's* ~** öz vədini / əhd-peymanını yerinə yetirmək; **4.** tost, sağlıq; **cheerful ~s** şux / şən tostlar; **to name the ~** tost / sağlıq demək

**pledge²** [pledʒ] *v* **1.** girov qoymaq; *He pledged his watch O, saatını girov qoydu*; **2.** təntənəli surətdə / şəkildə vəd etmək; **to ~ a donation** ianə vəd etmək; *They have pledged that they will always remain faithful Onlar təntənəli surətdə vəd verdilər ki, həmişə sadiq olacaqlar; He pledged himself never to tell the secret O, sirri heç vaxt açmayacağına təntənəli surətdə söz verdi*; **3.** *arx.* zamin olmaq / durmaq; **4.** bir kəsin sağlığına içmək

**pledgee** [plı'dʒi:] *n* girov alan / götürən

**pledger** ['pledʒəʳ] *n* girov qoyan / verən; zamin olan, zəmanətçi

**plenary** ['pli:nərı] *adj* **1.** plenar; **a ~ session of the assembly / conference** yığıncağın/konfransın plenar iclası; **2.** geniş; tam, qeyri-məhdud; **~ powers** geniş / qeyri-məhdud səlahiyyətlər

**plenipotentiary¹** [,plenıpə'tenʃərı] *n* səlahiyyətli nümayəndə, müvəkkil; **the undersigned plenipotentiaries** aşağıda imza atan/edən səlahiyyətli nümayəndələr

**plenipotentiary²** [,plenıpə'tenʃərı] *adj* **1.** səlahiyyətli, ixtiyarlı, səlahiyyətdar; **envoy extraordinary and minister ~** fövqəladə elçi və səlahiyyətli nazir; **2.** tam, qeyri-məhdud; **~ powers** tam / qeyri-məhdud səlahiyyətlər

**plenteous** ['plentjəs] *adj* = **plentiful**

**plentiful** ['plentıfl] *adj* bol, çox; çoxlu, zəngin; **a ~ supply of fresh vegetables** təzə tərəvəzlə bol təminat; *Strawberries are plentiful at the moment Hazırda çiyələk boldur*

**plentifully** ['plentıfəlı] *adv* bol, bolluca, bol-bol, çoxluca; *The farms are plentifully supplied with grain Təsərrüfatlar taxılla bol-bol təmin edilib*

**plenty¹** ['plentı] *n* bolluq, çoxluq; varlılıq; rifah, firavanlıq; **land of ~** bolluq ölkəsi; **year of ~** məhsuldar il, bolluq ili; **to live in peace and ~** sülh və firavanlıqda yaşamaq; **~ of money** çoxlu pul; **to have ~ of time** çox vaxtı olmaq; **a ~ of smoke** çoxlu tüstü; **to live in ~** bolluq içərisində / firavan yaşamaq; *Some people live in plenty, while others haven't enough to eat Bəzi adamlar bolluq içində / firavan yaşayır, digərlərinin isə doyunca yeməkləri yoxdur*

**plenty²** ['plentı] *adj* çox, çoxlu; bol; *There are plenty of English books here Burada çoxlu ingilis kitabları var*

**plenty³** ['plentı] *adv d.d.* olduqca çox, xeyli; lazımınca, kifayət qədər; **~ large enough** kifayət qədər böyük; *I was plenty cautious Mən çox / kifayət qədər / lazımınca ihtiyatlı oldum*

**plethora** ['pleθərə] *n* **1.** *tib.* qan çoxluğu, çoxqanlılıq; **2.** *məc.* artıq, artıqlıq, çoxluq, çox miqdar, həddindən artıq

**pleurisy** ['pluərısı] *n tib.* plevrit *(ağ ciyər pərdəsinin iltihabı)*

**pliable** ['plaıəbl] *adj* **1.** yumşaq, elastik, əyilən; asanlıqla əyilə bilən; *Cane is pliable when wet Yaş olanda qamış yumşaq / elastik olur*; **2.** sözəyatan, yolayaxın, sözqanan, tez razılaşan, sözəbaxan, yolagələn, üzüyola; **~ character** yolayaxın/sözəyatım xasiyyət; **~ judges** sözəyatan / yolagələn hakimlər

**pliancy** ['plaıənsı] *n* çeviklik, zireklik; elastiklik; **~ of mind** zəkanın çevikliyi

**pliant** ['plaıənt] *adj* **1.** elastik, əyilən, asanlıqla əyilə bilən, sınmayan; **the ~ twigs of young trees** cavan ağacların asanlıqla əyilə bilən budaqları; **2.** yumşaq, yolayaxın, tez /asanlıqla yolagələn / güzəştə gedən; **a ~ husband** yolagələn / güzəştə gedən/üzüyola ər

**pliers** ['plaıəz] *n (Özündən sonra fel cəmdə işlənir)* kəlbətin; **flat-nose ~** yastıağız kəlbətin

**plight¹** [plaıt] *n* vəziyyət; **to be in a sorry / sad ~** acınacaqlı vəziyyətdə olmaq

**plight²** [plaıt] *v şair.* **1.** söz / vəd vermək, öhdəlik götürmək; **2.** ad etmək, nişanlamaq, adaxlamaq; *His daughter was plighted to a doctor Onun qızı həkimə adaxlandı*;

◊ **to ~ *one's* troth 1)** söz / vəd vermək; **2)** adaxlanmaq, nişanlanmaq

**plighted** ['plaıtıd] *adj* **1.** verilmiş, vəd edilmiş; **~ word** verilmiş söz; **~ faith** sadiq olmağa and; **2.** nişanlanmış, adaxlanmış, ad edilmiş; **~ lovers** adaxlanmış / nişanlanmış sevgililər

**plimsolls** ['plımsəlz] *n* rezin altlığı olan yüngül parusin ayaqqabı; **a pair of ~** bir cüt yüngül parusin ayaqqabı

**plinth** [plınθ] *n* postament, özül, oturacaq, altlıq *(abidədə, heykəldə, sütunda)*

**plod** [plɒd] *v* **(-dd-) 1.** ağır-ağır yerimək, sallana-sallana getmək / gəlmək; sürünmək *(həm də* **to ~ on/along**) çətinliklə yerimək; *Labourers plodded home through the muddy fields Zəhmətkeşlər evə doğru palçıqlı sahə ilə çətinliklə yeriyirdilər*; **2.** inadla / cidd-cəhdlə işləmək, yorulmadan çalışmaq *(bir şey üzərində)*; *He plodded away at English grammar O, ingilis dili qrammatikası üzərində inadla işlədi/ yorulmadan çalışdı*



**plodder** ['plɒdəʳ] *n* **1.** zəhmətkeş, əməkçi; **2.** darıxdırıcı / usandırıcı adam

**plop¹** [plɒp] *n* şap *(bir şeyin suya ehmalla düşərkən çıxartdığı səs)*

**plop²** [plɒp] *v* **(-pp-)** şappıltı ilə atılmaq, şappıldatmaq, şappıltı salmaq; *The fish plopped back into the river Balıq şappıltı ilə geri suya atıldı*

**plosive** ['plousıv] *adj fon.* partlayan, partlayıcı; **~ sounds** partlayan səslər; *The sound [p] in "pipe" is (a) plosive "Pipe" sözündə [p] səsi partlayandır*

**plot¹** [plɒt] *n* I **1.** qəsd, sui-qəsd; əlbirlik, dilbirlik; gizli plan *(cinayət işində)*; **to lay/to hatch a ~** sui-qəsd təşkil etmək; **to defeat/to frustrate a ~** sui-qəsdi pozmaq; **to reveal / to uncover / to disclose a ~** sui-qəsdin üstünü açmaq; *The police have uncovered a plot to kidnap the President's daughter Polis prezidentin qızını oğurlamaq üçün təşkil edilmiş sui-qəsdin üstünü açıb*; **2.** fabula *(ədəbi əsərin və orada təsvir edilən hadisələrin məzmunu)*, süjet *(mövzu, məzmun)*; **subordinate ~** əlavə süjet; **unravelling of the ~** süjetin açılması; *The plot of the play is too tangled / complicated Pyesin süjeti çox dolaşıqdır / mürəkkəbdir*; **3.** *amer.* plan; sxem; çertyoj, diaqram

**plot** [plɒt] *n* II torpaq sahəsi; meşənin qırılmaq üçün ayrılan hissəsi; **grass ~** çəmənlik; **potato ~** kartof sahəsi; **a ~ of vegetables** tərəvəz sahəsi; **building ~** tikinti sahəsi; **a small ~ of land** kiçik torpaq sahəsi

**plot²** [plɒt] *v* **(-tt-)** I **1.** qəsd / sui-qəsd təşkil etmək; *They were plotting to overthrow the government Onlar hökuməti devirmək üçün sui-qəsd təşkil edirdilər*; **2.** plan tutmaq/cızmaq; planlaşdırmaq, təyin etmək; **to ~ out a meeting** iclas / yığıncaq təyin etmək; *The tragedy is nicely plotted out Faciənin süjeti yaxşı düşünülüb*

**plot** [plɒt] *v* **(-tt-)** II hissələrə bölmək / ayırmaq *(adət.* **to ~ out)**

**plotter** ['plɒtəʳ] *n* sui-qəsdçi, sui-qəsd düzəldən *(adam)*

**plough¹** [plau] *n* **1.** kotan; **to drive the ~** kotan sürmək / əkmək, şumlamaq; **2.** qartəmizləyən maşın; **3.** əkin yeri, şum, şumlanmış yer;

◊ **to follow the ~** kənd təsərrüfatı ilə məşğul olmaq; **to put / to set *one's* hand to ~** işə girişmək / başlamaq

**plough²** [plau] *v* **1.** əkmək, şumlamaq; *The farmers plough their fields in autumn or in spring Fermerlər tarlalarını ya payızda, ya da yazda şumlayırlar / əkirlər*; **2.** əkilmək; *This land ploughs hard / well Bu torpaq çətin / yaxşı əkilir*; **3.** şırım açmaq, şumlamaq; **4.** çətinliklə hərəkət etmək / irəliləmək; yol açmaq *(həm də* **to ~ *one's* way**); *The great ship ploughed (across) the ocean Böyük gəmi okeanda çətinliklə irəliləyirdi; He ploughed his way through the crowd O, izdihamın içindən özünə çətinliklə yol açdı*; **to ~ around** əli ilə yol tapmaq; **to ~ into** *amer.* bir işə ciddi girişmək; **to ~ up the earth** torpağı yumşaltmaq / əkmək / şumlamaq;

◊ **to ~ the sands / the air** ≅ boş / mənasız işlə məşğul olmaq, bihudə yerə güc sərf etmək

**ploughable** ['plauəbl] *adj* yaxşı əkilən / şumlanan, şuma/əkinə yararlı; **~ land** yaxşı əkilən / şuma yararlı torpaq

**plough-beam** ['plaubi:m] *n k.t.* kotan yolu

**plough-boy** ['plaubɔı] *n* kotançı, kotan sürən, cütçü

**ploughman** ['plaumən] *n (pl* **-men** [-mən]) **1.** cütçü, əkinçi, kotançı; **2.** kəndli, kənd əhli

**plough-tail** ['plauteıl] *n* kotanın dəstəyi

**ploy** [plɔı] *n* **1.** biclik, kələk, fırıldaq; **2.** sevimli məşğuliyyət, ən sevilən əyləncə

**pluck¹** [plʌk] *n* **1.** dartma, çəkmə; **to give a ~ at *smth.*** bir şeyi dartmaq / çəkmək; *She gave my sleeve a pluck O mənim qolumdan dartdı / çəkdi*; **2.** cürət, cəsarət; igidlik, qoçaqlıq; şücaət, hünər; mətanət; *He has plenty of pluck O çox qoçaqdır / cəsarətlidir*; **3.** kəsilmə *(imtahanda)*

**pluck²** [plʌk] *v* **1.** dərmək, qopartmaq; üzmək; **to ~ fruit** meyvə dərmək; **to ~ flowers** çiçək dərmək / qopartmaq / üzmək; **to ~ a rose** qızılgül qopartmaq / üzmək; **2.** yolmaq; **to ~ a goose / a hen** qaz / toyuq yolmaq; **to ~ at *one's* hair** saçını yolmaq; **3. (at, by)** dartmaq, çəkmək; **to ~ (at) *smb.'s* sleeve** bir kəsin qolundan dartmaq; **4.** *d.d.* soymaq, talan etmək, oğurlamaq, varyoxunu almaq; aldatmaq; yarmaq *(bankı)*; **to ~ a bank** bank yarmaq; **5.** *d.d.* imtahanda kəsmək; **to be ~ed** imtahanda kəsilmək;

◊ **to ~ up *one's* courage/heart/ spirits** cəsarət etmək, cəsarətlənmək, ruhlanmaq, cəsarətini toplamaq; *She could not pluck up courage to speak a word O, bir söz deməyə belə cəsarət etmədi*

**plucked** [plʌkt] *adj* **1.** qopardılmış, dərilmiş; **~ rose** dərilmiş / qopardılmış qızılgül; **2.** yolunmuş; **a ~ goose** yolunmuş qaz; **3.** *d.d.* imtahanda kəsilmiş

**plucky** ['plʌkı] *adj d.d.* cəsarətli, cürətli; ürəkli, qoçaq; qətiyyətli; **a ~ boy** cəsarətli / qoçaq oğlan

**plug¹** [plʌg] *n* **1.** tıxac, probka; *She pulled the plug out of the bath and the dirty water ran away O, tıxacı vannadan çıxartdı və çirkli su axıb getdi*; **2.** *el.* probka; **3.** bacarıqsız adam, pis işçi; **4.** *amer.* saxta pul; **5.** *amer.* reklam; **6.** *d.d.* güllə; **7.** *tib.* tampon, piltə

**plug²** [plʌg] *v* **(-gg-) 1.** probkalamaq, tıxaclamaq *(həm də* **to ~ up**); *The leak in the pipe was plugged Borudakı axını tıxacladılar*; **2.** divara

ağac probka vurmaq *(mismar üçün)*; 3. *tib.* tampon / piltə qoymaq *(yaraya)*; 4. plomb qoymaq *(dişə)*; 5. *d.d.* planı puça çıxartmaq; 6. *d.d.* 1) zərbə endirmək; 2) güllə vurmaq; 7. reklam etmək; **to ~ along** yavaş-yavaş getmək / yerimək, sürünmək; **to ~ away (at)** var gücü ilə işləmək, yorulmadan çalışmaq / əlləşmək; *She has been plugging away at her French for months O, fransız dili üzərində aylarla yorulmadan çalışır;* **to ~ in** *el.* probka qoymaq / salmaq; **to ~ up** tıxamaq, kip bağlamaq

**plugged** [plʌgd] *adj* 1. tıxanmış, probkalanmış; 2. *d.d.* saxta *(pul haq.)*

**plugger** ['plʌgəʳ] *n d.d.* 1. çalışqan tələbə, əzbərçi; çalışqan işçi; 2. *amer.* muzdlu qatil

**plughole** ['plʌghoul] *n* tıxac / probka yeri *(vanna və əlüzyuyanda)*; **to wash the ~** tıxac yerini yumaq

**plum** [plʌm] *n bot.* 1. gavalı ağacı; 2. gavalı *(meyvə)*; **dried ~** qurudulmuş gavalı, quru gavalı; 3. tünd-qırmızı kül rəngi;

◊ *He is waiting for the plums to fall into his mouth at. söz. ≅ Allahdan buyruq, ağzıma quyruq*

**plumage** ['plu:mɪdʒ] *n* tük, lələk *(quşlarda)*

**plumb[1]** [plʌm] *n* 1. şaqul; dik yamac, dik istiqamət; 2. ağırlıq; 3. lot *(dənizin dərinliyini ölçmək üçün cihaz)*

**plumb[2]** [plʌm] *adj* vertikal, şaquli; dik; vertikal vəziyyətdə; **to keep *smth.* ~** bir şeyi vertikal / dik vəziyyətdə saxlamaq

**plumb[3]** [plʌm] *v* 1. vertikal / dik qoymaq; 2. dərinliyi ölçmək, lot salmaq; 3. anlamaq, başa düşmək, dərk etmək; **to ~ the mysteries of the universe** kainatın sirlərini dərk etmək; **to ~ the depths of mystery** sirrin dərinliyini dərk etmək; 4. *d.d.* kanalizasiya çəkmək

**plumb[4]** [plʌm] *adv* 1. vertikal, şaquli, dik; perpendikulyar; 2. dürüst, düz, dümdüz, tam; *The house is plumb in the middle of the island Ev düz adanın ortasındadır*

**plumbing** ['plʌmɪŋ] *n* 1. su kəməri, su kəməri sistemi; **to install new ~** yeni su kəməri çəkmək; 2. okeanın dərinliyini ölçmə; 3. *d.d.* 1) ayaqyolu; 2) tualet otağı *(artistlərin geyindiyi otaq)*; 4. *kim.* qurğuşunla zərb etmə

**plume[1]** [plu:m] *n* lələk

**plume[2]** [plu:m] *v* 1. bəzənmək, özünə bəzək /rövnəq vermək; **to ~ oneself upon / on /for *smth.*** bir şeylə öyünmək / lovğalanmaq; 2. lələklə bəzəmək

**plumed** [plu:md] *adj* lələklə bəzədilmiş

**plummy** ['plʌmɪ] *adj* məlahətli, yaxşı, gözəl, qəşəng; **~ voice** məlahətli səs

**plump[1]** [plʌmp] *n* şappıltı, gurultu, səs *(suyun tökülməsindən əmələ gələn); The stone fell and gave a mighty plump Daş düşdü və bərk gurultu qopardı;* **to fall with a ~** şappıltı ilə düşmək / yıxılmaq

**plump[2]** [plʌmp] *adj* dolğun, kök, koppuş, şişman; **~ little hands** balaca koppuş əllər; **~ fowl** kök quş; **a ~ face** koppuş sifət; **a babe/baby with ~ cheeks** koppuş yanaqlı uşaq; *The girl is rather short and plump Qız çox gödək və şişmandır*

**plump[3]** [plʌmp] *v* 1. vurmaq, tappıldatmaq, guppsamaq, gumbuldatmaq, atmaq, tullamaq, tolazlamaq; *She plumped down the money and walked out O, pulu yerə tolazladı və çıxıb getdi; He plumped himself down on the grass O özünü otun üstünə atdı;* 2. tappıltı ilə / guppultu ilə düşmək; *She plumped to her knees in front of her father O, atasının qarşısında guppultu ilə dizi üstə çökdü*

**plump[4]** [plʌmp] *adv d.d.* 1. qəflətən, qəfildən, gözlənilmədən; *He fell plump into the water O qəfildən suya yıxıldı;* 2. açıq, açıqdan-açığa, üzünə; **to say *smth.* ~** bir şeyi açıq demək

**plumpness** ['plʌmpnɪs] *n* köklük, koppuşluq, dolğunluq, şişmanlıq

**plum-tree** ['plʌmtri:] *n* gavalı ağacı

**plunder[1]** ['plʌndəʳ] *n* 1. soyğun, soyğunçuluq, qarət, talan, çapqın, quldurluq; 2. oğurlanmış / oğurluqla əldə edilmiş şey / mal; *The thieves hid their plunder in the cave Oğrular oğurladıqları şeyləri mağarada gizlətdilər;* 3. *d.d.* qazanc, fayda, mənfəət

**plunder[2]** ['plʌndəʳ] *v* 1. soymaq, qarət / talan etmək, çalıb-çapmaq *(xüs. müharibə vaxtı); They plundered the helpless villagers Onlar köməksiz kəndliləri talan etdilər / çapıb-taladılar;* 2. oğurlamaq, qaçırmaq

**plunderer** ['plʌndərəʳ] *n* soyğunçu, talançı, çapqınçı, yolkəsən; oğru

**plunge[1]** [plʌndʒ] *n* 1. baş vurma, cumma, dalma *(suya)*; **to take a ~** suya baş vurmaq / dalmaq / cummaq; 2. *amer.* çimmək üçün çarhovuz;

◊ **to take the ~** həlledici/qəti hərəkət etmək; çətinliyə qarşı sinə gərmək; *They have finally decided to take the plunge and get married Onlar nəhayət evlənmək haqqında qəti qərar qəbul ediblər*

**plunge[2]** [plʌndʒ] *v* 1. cummaq, baş vurmaq, dalmaq *(suya)*; sualtı üzmək; **to ~ into the icy water** buz kimi soyuq suya cummaq / baş vurmaq; 2. batırmaq, sancmaq, soxmaq, salmaq; **to ~ a dagger into *smb.'s* heart** xəncəri bir kəsin ürəyinə soxmaq; **to ~ a thermometer into water** suya termometr salmaq; **to ~ *one's* hands into *one's* pockets** əllərini ciblərinə soxmaq; 3. batmaq; *The submarine was slowly plunging Sualtı qayıq yavaş-yavaş batırdı;* 4. atmaq, atılmaq; soxulmaq, cummaq; *The sudden stopping of the car plunged him forward Maşının qəfildən dayanması onu irəli atdı;* **to ~ into the room** otağa soxulmaq; **to ~ out of the room** otaqdan çölə atılmaq /qaçmaq; 5. giriftar /düçar etmək; **to ~ *smb.* into dispair / grief** bir kəsi ümidsizliyə / qüssəyə düçar etmək; **to ~ *one's* family into poverty** ailəsini dilənçi kökünə salmaq; **to ~ a country into war** ölkəni müharibəyə düçar/sövq etmək; 6. sərt enmək; *The path plunges to the sea Cığır dənizə doğru sərt enir*



**plunger** ['plʌndʒəʳ] *n* 1. suya tullanan / cuman; 2. dalğıc; 3. *d.d.* azartlı / qızğın qumarbaz

**plunging** ['plʌndʒɪŋ] *n* 1. batma, dalma *(suya)*; 2. *d.d.* qumar oyunu *(xüs. cıdırda)*

**plunk[1]** [plʌŋk] *n* 1. zınqıltı / cingilti səsi *(xüs. gitaranın, banconun, tarın və s. musiqi alətlərinin)*; 2. güclü / qüvvətli zərbə; partıltı, partıldama *(probkanın səsi)*; 3. *amer. jarq.* dollar

**plunk[2]** [plʌŋk] *v* 1. simlərə bir-bir toxunmaq; **to ~ the gitar** gitaranın simlərini bir-bir dınqıldatmaq, gitara çalmaq; 2. guppultu / tappıltı ilə düşmək

**pluperfect** [ˌplu:'pə:fɪkt] *n qram. (həm də* **past perfect***)* keçmiş zamanın bitmiş forması

**plural[1]** ['pluərəl] *n qram.* cəm forması; **~ of nouns** isimlərin cəmi / cəm forması

**plural[2]** ['pluərəl] *adj* 1. *qram.* cəm; cəm formada olan; **~ noun** cəmdə / cəm formada olan isim; 2. müxtəlif, müxtəlif cinsli / tərkibli, yekcins olmayan; **~ population** müxtəlif millətlərdən ibarət olan/ çoxmillətli əhali

**pluralism** ['pluərəlɪzm] *n* 1. *fəls.* plüralizm; 2. əvəzçilik; eyni zamanda bir neçə vəzifə tutma *(xüs. kilsədə)*; 3. müxtəlif irqdən və ya millətlərdən ibarət dövlət nəzəriyyəsi

**pluralist** ['pluərəlɪst] *n* 1. *fəls.* plüralist *(plüralizm tərəfdarı)*; 2. əvəzçi, bir neçə vəzifəni birdən daşıyan şəxs; 3. çoxmillətli və ya müxtəlif irqdən ibarət olan dövlətin tərəfdarı

**plurality** [pluə'rælɪtɪ] *n* 1. çoxluq; 2. çox / külli miqdar; 3. *qram.* cəmlik

**plus[1]** [plʌs] *n* 1. üstəgəl işarəsi; 2. müsbət kəmiyyət; 3. əlavə miqdar; 4. *məc.* üstün / yaxşı cəhət

**plus[2]** [plʌs] *adj* 1. əlavə, əlavə / üstəlik verilən; 2. müsbət; *The temperature is plus four degrees Temperatur müsbət dörd dərəcədir;* 3. *riyaz., el.* müsbət

**plus[3]** [plʌs] *prep* 1. plyus, üstəgəl; *Two plus five is seven İki plyus / üstəgəl beş yeddi edir; Two plus two equals four İki üstəgəl iki dördə bərabərdir;* 2. *d.d.* əlavə, üstəlik, üstəgəl

**plus-fours** ['plʌs'fɔ:z] *n* qolf şalvarı *(qısamanjetli şalvar)*

**plush[1]** [plʌʃ] *n* plüş *(uzun xovlu məxmər)*

**plush[2]** [plʌʃ] *adj* 1. plüş; 2. *amer. d.d.* qəşəng; çox rahat və bahalı; **a ~ hotel** çox rahat və bahalı hotel/mehmanxana; **a ~ restaurant** çox qəşəng və bahalı restoran

**plushy** ['plʌʃɪ] *adj* 1. plüşəbənzər, plüşəoxşar; 2. = **plush[2]**

**plutocracy** [plu:'tɔkrəsɪ] *n* 1. plutokratiya *(dövlət hakimiyyəti dövlətlilər, varlılar əlində olan siyasi quruluş)*; 2. plutokratlar *(var-dövləti sayəsində nüfuz və hakimiyyətə sahib olan adamlar)*

**plutocrat** ['plu:təkræt] *n* plutokrat *(var-dövləti sayəsində nüfuza və hakimiyyətə sahib olan adam)*

**plutonium** [plu:'tounɪəm] *n kim.* plutonium *(süni yolla alınan kimyəvi element)*

**ply[1]** [plaɪ] *n* 1. əymə, qatlama, bükmə; bükük, büküş; 2. burum, bir burum; sap, ip; 3. qat; **three-~ wool** üçqat yun;

◊ **to take a ~** istiqamət götürmək / almaq

**ply[2]** [plaɪ] *v (pt, pp* **plied** [plaɪd]) 1. məşğul olmaq *(hər hansı bir fəaliyyətlə)*; **to ~ a trade** bir sənətlə / peşə ilə məşğul olmaq; 2. səylə işləmək; **to ~ a spade** bellə işləmək; **to ~ the needle** tikişlə məşğul olmaq; 3. təkidlə qonaq etmək; *They plied him with food and drink Onlar onu yaxşıca yedirtdilər və içirtdilər;* 4. tovlamaq, dilə tutmaq, razı etmək, inandırmaq *(bir şeylə)*; 5. işləmək *(müəyyən istiqamət üzrə müntəzəm gedib-gəlmək: gəmi, taksi, avtobus və s. haq.); This ship plies between London and Australia Bu gəmi Londonla Avstraliya arasında işləyir;*

◊ **to ~ the seas** dənizlərdən üzüb keçmək; dənizlə gedib-gəlmək

**plywood[1]** ['plaɪwud] *n* faner; **sheets of ~** faner təbəqələri

**plywood[2]** ['plaɪwud] *adj* faner, fanerdən hazırlanmış; **~ furniture** fanerdən hazırlanmış mebel

**pm** [ˌpi:'em] *n amer.* **P.M.** *latın dilindəki* **post meridiem** *sözbirləşməsinin qısa forması;* **at 3 ~** günortadan sonra saat 3-də

**pneumatic** [nju:'mætɪk] *adj* pnevmatik, sıxılmış hava ilə işləyən; hava ilə doldurulmuş; **~ boat** hava ilə doldurulmuş qayıq; **~ tyre / hammer** pnevmatik şin / çəkic

**pneumonia** [nju:'mounjə] *n tib.* pnevmoniya, sətəlcəm; **single / double ~** birtərəfli / ikitərəfli sətəlcəm

**poach** [poutʃ] *v* 1. başqasının torpağına soxulmaq; 2. icazəsiz ov etmək *(həm də* **to go ~ing**); **to ~ hares** başqasının ərazisində dovşan ovu ilə məşğul olmaq; 3. *məc.* qarışmaq; **to ~ in other people's business** başqa adamların işinə qarışmaq; **to ~ on *smb.'s* preserves** bir kəsin şəxsi həyatına qarışmaq; 4. mənimsəmək, yiyələnmək *(başqasının fikrini və s.)*; qeyri-qanuni mənimsəmək; oğurlamaq; 5. balığı / meyvəni *və s.* azca maye tökməklə ahəstəcə bişirmək

**poacher** ['poutʃəʳ] *n* brakonyer *(icazəsiz ov edən adam)*

**poachy** ['poutʃɪ] *adj* nəm, rütubətli, bataqlı *(torpaq haq.)*

**pocket[1]** ['pɔkɪt] *n* 1. cib; **a deep ~** dərin cib; **a coat / jacket / trouser ~** palto / pencək / şalvar cibi; *My keys are in my pocket Mənim açarlarım cibimdədir;* **to put *one's* hand into *one's* ~** 1) əlini cibinə qoymaq; 2) *məc.* əlini cibinə sal-

maq, pul xərcləmək; *My pocket can't stand all the new demands Mənim cibim bütün yeni tələblərə tab gətirə bilməz*; 2. *məc.* zənginlik, var-dövlət; 3. luza *(bilyard stolunun yanlarından və künclərindən asılan tor torba)*

**pocket²** ['pɔkɪt] *adj* cib; a ~ **dictionary** cib lüğəti; ~ **money** cib xərcliyi; a ~ **knife** cib bıçağı

**pocket³** ['pɔkɪt] *v* **1.** cibinə qoymaq *(həm də* **to ~ up**); *The girl quickly pocketed the letter without reading it Qız məktubu oxumadan (onu) cəld cibinə qoydu*; 2. mənimsəmək, cibinə salmaq; *He received 50 dollars for expenses, but he pocketed most of it O xərcləmək üçün 50 dollar aldı, lakin əksər hissəsini mənimsədi / cibinə saldı*; 3. qazanmaq, gəlir götürmək; *He pocketed a nice sum over the translation O, tərcümədən yaxşıca pul qazandı*; 4. basmaq, boğmaq *(hirsi, iddianı)*; *Pocket your pride and ask him for a loan İddianı / İddianızı bas, / basın, ondan borc istə / istəyin*; 5. şarı luzaya salmaq *(bilyard oyununda)*

**pocketbook** ['pɔkɪtbuk] *n* 1. cib dəftəri; 2. bumajnik *(portmanat)*

**pocketful** ['pɔkɪtful] *n (pl* **-fuls**) bir cib, cibdolusu; a ~ **of money** bir cib / cibdolusu pul

**pocket-glass** ['pɔkɪtglа:s] *n* cib güzgüsü

**pocket-handkerchief** [ˌpɔkɪt'hæŋkətʃɪf] *n* cib dəsmalı

**pocket-picking** ['pɔkɪtˌpɪkɪŋ] *n* cib oğurluğu, cibə girmə

**poem** ['pouɪm] *n* şer; poema; **to write ~s** şerlər yazmaq

**poet** ['pouɪt] *n* şair

**poetess** [ˌpouɪ'tes] *n* şairə

**poetic** [pou'etɪk] *adj* poetik, bədii; ~ **language** bədii dil; ~ **style** bədii üslub

**poetical** [pou'etɪkl] *adj* 1. mənzum; ~ **play** mənzum pyes; ~ **works** mənzum əsərlər; 2. şairanə; gözəl, məftunedici, valehedici

**poetically** [pou'etɪklɪ] *adv* şairanə bir tərzdə; gözəl, qəşəng

**poetry** ['pouətrɪ] *n* 1. poeziya; şer, nəzm; 2. *məc.* bədiilik, şeriyyət; gözəllik, zəriflik, qəşənglik; məftunedicilik

**pogrom** ['pɔgrəm] *n* talan, çapqın, qırğın

**poignancy** ['pɔɪnjənsɪ] *n* 1. kəskinlik, itilik, tündlük; 2. əzab, əziyyət, acı; şiddət *(ağrıda)*; acılıq *(sözdə və s.)*

**poignant** ['pɔɪnjənt] *adj* 1. tünd, kəskin; ~ **sauce** tünd sous; ~ **perfume** kəskin iy; ~ **retort** kəskin cavab; 2. acı, şiddətli, əziyyətli, əzablı, üzücü; ~ **sorrow** üzücü / acı kədər; ~ **hunger** üzücü aclıq; ~ **tears** acı göz yaşları; ~ **memories** acı xatirələr; 3. dözülməz, kəskin, iti, şiddətli, bərk; ~ **wit** kəskin/iti ağıl

**point¹** [pɔɪnt] *n* 1. uc; **the ~ of a pin /knife / pencil, *etc.*** sancağın /bıçağın / karandaşın *və s.*-in ucu; 2. nöqtə; işarə; **(full) ~** nöqtə *(durğu işarəsi)*; a ~ **of interrogation / of exclamation** sual / nida işarəsi; 3. onluq kəsri tam ədəddən ayıran nöqtə; **five ~ six (5.6)** beş tam onda altı (5,6); 4. yer; məntəqə; ~ **of destination** mənzil başı, çatma yeri; ~ **of departure** yola salma /düşmə məntəqəsi; **at all ~s** hər yerdə; 5. an, vaxt; **at the ~ of death** ölüm anında; **at any ~** istənilən anda; *When it came to the point, he refused his help Anı/Vaxtı çatanda, o, köməyindən imtina etdi*; 6. *id.* xal; *He scored 20 points O. 20 xal yığdı / topladı; She got 85 points out of a possible 100 Mümkün olan 100 xaldan o, 85-ni yığdı / topladı*; **to give some ~s to** əvvəlcədən / bəri başdan bir neçə xal vermək; *He can give to any opponent İstənilən rəqibə o bəri başdan xal verə bilər*; 7. bənd; **~s in a speech** çıxışın bəndləri; ~ **by ~** bəndbəbənd, bəndbənd; **at all ~s** bütün bəndlər üzrə; *We differ on these points Bu bəndlər üzrə biz razılaşmırıq*; 8. məsələ, iş; ~ **at issue** mübahisəli məsələ; a **case in ~** müzakirə olunan məsələ; 9. əsas, mahiyyət, məna; *You've missed the whole point Sən / Siz ən əsas məsələni nəzərdən qaçırdın / qaçırdınız; That's the point Əsas məsələ / mahiyyət budur; That's not the point Əsas məsələ bu deyil*; **to come to the ~** əsas məsələyə gəlmək; **to keep to the ~** əsas mahiyyətdən danışmaq; 10. məqsəd, məram; niyyət, arzu, murad, fikir; *What's your point in coming? Sənin / Sizin gəlişinin / gəlişinizin məqsədi nədir? There is no point in doing that Onu etməyin heç bir mənası yoxdur*; **to gain / to carry *one's* ~** məqsədinə / arzusuna / muradına çatmaq; 11. fərqləndirici cəhət; **the best ~ in his character** onun xasiyyətində ən yaxşı fərqləndirici cəhət;

◊ ~ **of view** nöqteyi-nəzər, baxım; **in ~ of fact** həqiqətdə, faktiki olaraq; **to make a ~ of *smth.*** 1) bir şeyə xüsusi fikir vermək / diqqət yetirmək; 2) bir şeyi ətraflı nəzərdən keçirmək; **to come to ~s** qılıncı qından çıxartmaq, mübarizəyə başlamaq; **to be on the ~ of doing *smth.*** bir işi görməyə hazırlaşmaq / etməyə hazırlaşmaq

**point²** [pɔɪnt] *v* 1. *(adət.* **at, to**) göstərmək; işarə etmək, nişan vermək *(əllə, barmaqla və s.)*; **to ~ the finger at an object** barmağı ilə bir əşyanı / obyekti göstərmək; *It's rude to point Barmaqla göstərmək qabalıqdır / kobudluqdur; The hands of the clock pointed to half past one Saatın əqrəbləri ikinin yarısını göstərirdi*: **to ~ to a door** qapını göstərmək *(yəni qovmaq)*; 2. istiqamətləndirmək, yönəltmək *(topu)*, nişan almaq, hədəfə götürmək; **to ~ a gun at *smb.*** silahı bir kəsə yönəltmək, bir kəsi nişan almaq; 3. göstərmək, şahidlik etmək; *All the evidence points to his guilt Bütün ifadələr onun günahkar olduğunu göstərir; Everything points to your being wrong Hər şey sənin / sizin haqsız olduğunu/olduğunuzu göstərir*; 4. çərtmək, qədləmək; itiləmək; şişləmək; **to ~ a pencil** karandaş çərtmək / qədləmək; **to ~ off** xətlə/nöqtə ilə ayırmaq *(onluq kəsrdə: tam ədədi kəsrdən ayırmaq üçün)*; **to ~ out** 1) qeyd etmək; *He pointed out that there were certain formalities to be observed O qeyd etdi ki, müəyyən rəsmiyyətlərə riayət edilməlidir*; 2) göstərmək; **to ~ out mistakes** səhvləri göstərmək





**pointed** ['pɔɪntɪd] *adj* 1. sivri, şişuclu, sivriuclu, şiştəpəli, şülək; ~ **arch** sivriuclu / şiştəpəli tağ; a ~ **instrument / tool** şişuclu alət; a ~ **hat** şülək / şiştəpəli şlyapa; 2. iti, şiş; nazik; a ~ **nose** şiş/ dimdik burun; ~ **fingers** nazik barmaqlar; 3. çərtilmiş, şişlənmiş *(karandaş və s.)*; 4. kəskin; ~ **retort** kəskin etiraz; ~ **remark** kəskin məzəmmət; ~ **wit** kəskin / iti ağıl / zəka; 5. dəqiq, düz; mükəmməl; ~ **correctness** mükəmməl dəqiqlik

**pointedly** ['pɔɪntɪdlɪ] *adv* 1. açıq, açıqcasına, açıq-aydın, açıqdan-açığa; şübhəsiz; *He pointedly ignored the question O, açıqdan-açığa suala əhəmiyyət vermədi / etinasızlıq göstərdi*; 2. acı-acı, acı; çox kəskin, kəskin surətdə; *She stared pointedly at me O tərs-tərs mənə baxdı*

**pointer** ['pɔɪntə$^{r}$] *n* I 1. əqrəb *(saatda, tərəzidə və s.)*; 2. göstərici *(cihazda)*; 3. *d.d.* eyham, işarə, him; 4. *hərb.* tuşlayıcı *(topda, pulemyotda)*

**pointer** ['pɔɪntə$^{r}$] *n* II poynter *(hamartüklü tula cinsi)*

**pointful** ['pɔɪntful] *adj* yerli, yerində, uyğun, münasib; a ~ **question** yerli / münasib sual; a ~ **remark** yerli irad

**pointillism** ['pɔɪntɪlɪzm] *n inc.* puantilizm *(rəngkarlıq üsullarından biri)*

**pointing** ['pɔɪntɪŋ] *n* 1. göstərmə; göstəriş; 2. eyham, işarə; yerindən / yavaşca demə; 3. durğu işarələrinin qoyulması

**pointless** ['pɔɪntlɪs] *adj* 1. küt, ucsuz, ucu olmayan; 2. mənasız, məqsədsiz; a ~ **remark** mənasız irad

**pointlessness** ['pɔɪntlɪsnɪs] *n* mənasızlıq, heçlik; **the ~ of his existence** onun mövcudluğunun mənasızlığı / heçliyi

**poise¹** [pɔɪz] *n* 1. tarazlıq, müvazinət; sabitlik, davamlılıq; **to lose *one's* ~** müvazinətini / tarazlığını itirmək; **to recover *one's* ~** tarazlığını / müvazinətini düzəltmək; *She seemed embarrassed for a moment but quickly recovered her poise O bir anlığa özünü itirmiş kimi göründü, lakin dərhal müvazinətini düzəltdi*; 2. ağırlıq, tarazlıq, təmkinlilik *(xasiyyətdə)*; **a man of ~** təmkinli / ağır adam; 3. səbir, dözüm, soyuqqanlılıq, iradə, özünü saxlama; **to recover *one's* ~** özünü saxlamaq, dözüm göstərmək, sakitləşmək; 4. oturuş, duruş, vüqar, boy-buxun

**poise²** [pɔɪz] *v* 1. tarazlamaq, tarazlığı / müvazinəti saxlamaq; **to ~ a basket on *one's* head** səbəti başında aparmaq; 2. götür-qoy etmək, ətraflı düşünmək / fikirləşmək

**poison¹** ['pɔɪzn] *n* 1. zəhər, ağı; **rat ~** siçan zəhəri; ~ **for killing weeds** alaq otlarını məhv etmək üçün zəhər; **to commit suicide by taking ~** zəhər içməklə intihar etmək / özünü öldürmək; *He took poison by mistake for a medicine, and it nearly killed him O, dərman əvəzinə səhvən zəhər içdi və bu da az qala onu öldürmüşdü*; 2. *məc.* zərərli, məhvedici, fəlakətli; **the ~ of this doctrine** bu doktrinanın fəlakətli/zərərli təsiri; **the ~ of racial hatred** irqi nifrətin fəlakəti

**poison²** ['pɔɪzn] *adj* zəhərli; ~ **gas** zəhərli qaz; a ~ **pill** zəhərli həb

**poison³** ['pɔɪzn] *v* 1. zəhərləmək, zəhər vermək, ağılamaq, ağı vermək; **to ~ the wells** su quyularını zəhərləmək; *Someone has poisoned our dog Kimsə bizim itə zəhər verib*; 2. korlamaq, zəhərləmək; **to ~ a person's mind** bir adamın şüurunu korlamaq / zəhərləmək; 3. məhv / puç etmək; *This poisoned his whole life Bu onun bütün həyatını puç etdi*; **to ~ the pleasure** kefi / ləzzəti zəhərə döndərmək

**poisoned** ['pɔɪznd] *adj* zəhərli, ağılı, zəhərlənmiş; zəhər qatılmış; a ~ **arrow** zəhərli / zəhərlənmiş ox; a ~ **dart** zəhərli neştər

**poisoner** ['pɔɪznə$^{r}$] *n* zəhərləyən, ağılayan; zəhər / ağı verən *(adam)*

**poisoning** ['pɔɪznɪŋ] *n* zəhərlənmə, ağılanma; **lead ~** qurğuşundan zəhərlənmə; **gas ~** qazdan zəhərlənmə

**poisonous** ['pɔɪzənəs] *adj* 1. zəhərli; ~ **snakes / plants / insects, *etc.*** zəhərli ilanlar / bitkilər / həşəratlar *və s.*; *Some plants have poisonous roots or fruit Bəzi bitkilərin kökləri və ya meyvəsi zəhərli olur / zəhərlidir*; 2. ziyanlı, məhvedici, öldürücü, zərərli; ~ **influence** ziyanlı / zərərli təsir; ~ **ideas** zərərli fikirlər; 3. *məc.* acı; ~ **tongue** acı dil; ~ **words** acı sözlər; 4. *d.d.* iyrənc, çox pis, çirkin, mənfur; a ~ **meal** iyrənc yemək; *What a poisonous meal! Nə iyrənc yeməkdir!*

**poison-pen** ['pɔɪznpen] *n* anonim / imzasız məktub müəllifi, anonim / imzasız məktub yazan *(adam)*

**poison-pen letter** [ˌpɔɪzn'penletə$^{r}$] *n* anonim / imzasız məktub

**poke¹** [pouk] *n* 1. təkan; itələmə; dürtmə; **to give *smb.* a ~ in the ribs** bir kəsin qabırğasına dürtmə vurmaq; 2. *d.d.* yumruqla vurma, yumruqlama

**poke²** [pouk] *v* 1. itələmək, dürtmələmək, dürtmə vurmaq; **to ~ *smb.* in the ribs** bir kəsin qabırğasını dürtmələmək *(dostyana, və ya bir şeyi anlatmaq üçün)*; **to ~ at with the horns** buynuzlamaq, buynuzları ilə dürtmələmək; 2. *d.d.* yumruqlamaq, yumruqla vurmaq; 3. soxmaq, basmaq, dürtmək; **to ~ a sweet into *smb.'s* mouth** bir kəsin ağzına konfet soxmaq / dürtmək; *I poked three shillings into his hand Mən onun əlinə üç şillinq basdım*; 4. dəlmək, deşmək; deşik / dəlik açmaq; **to ~ a hole in a**

**drum** barabanda/ təbildə deşik açmaq, barabanı /təbili deşmək; 5. beli bükülmək; belini əymək; *The old man poked most terribly Qoca kişinin beli dəhşətli şəkildə əyilib;* 6. əli ilə axtarmaq, əl vura-vura getmək; eşələnmək; **to ~ into every corner** bütün küncləri eşələmək; **to ~ *one's* way into a place** əl ilə yoxlaya-yoxlaya bir yerə girmək; 7. tənbəllik etmək, veyllənmək, boş-bikar / avara gəzmək; **to ~ about 1)** axtarmaq, baxmaq; *We poked about for an hour in the old furniture-shop Biz təxminən bir saat qədim mebel satılan mağazada veylləndik;* **2)** əl ilə axtarmaq; **to ~ away** itələmək, bir tərəfə itələmək; **to ~ off** *d.d.* boş-boş / avara-avara gəzmək, veyllənmək, avaralanmaq; **to ~ out 1)** itələyib çıxartmaq, qovmaq; **2)** çıxartmaq; **to ~ *one's* head out of the window** başını pəncərədən çıxartmaq; **3)** görünmək *(maşın və s. haq.);*

◊ **to ~ *one's* nose into other people's affairs** burnunu başqalarının / başqa adamların işinə soxmaq; **to ~ fun at *smb.*** bir kəsi ələ salmaq / lağa qoymaq, bir kəsə rişxənd etmək

**poker¹** [ˈpoukəʳ] *n* I odçəkən, ataşkeş *(ocaqda odu qarışdırmaq üçün alət)*

**poker** [ˈpoukəʳ] *n* II poker *(qumar oyunlarından birinin adı)*

**poker²** [ˈpoukəʳ] *v* 1. odçəkənlə / ataşkeşlə qarışdırmaq *(odu, ocağı);* 2. damğa basmaq / vurmaq *(dəriyə, ağaca və s.)*

**poker-face** [ˈpoukəfeɪs] *n* soyuq / ifadəsiz sifət

**pokerish** [ˈpoukərɪʃ] *adj* zabitəli; ifrat dərəcədə ciddi, rəsmiyyətpərəst, rəsmiyyətçi

**poky** [ˈpoukɪ] *adj* kiçik, balaca; darısqal; **a ~ little room** balaca darısqal otaq

**polar** [ˈpouləʳ] *adj* 1. qütb, şimal; **a ~ ice** qütb buzu; **~ explorers** qütb tədqiqatçıları; **~ light** qütb parıltısı; 2. bir-birinə zidd, daban-dabana əks

**polar bear** [ˈpouləbeəʳ] *n zool.* şimal ayısı, ağ ayı

**polar fox** [ˈpouləfɔks] *n zool.* şimal tülküsü

**polar hare** [ˈpouləheəʳ] *n zool.* şimal dovşanı

**polarity** [pəˈlærɪtɪ] *n* 1. **(between)** ziddiyyət; **the growing ~ between the left and right wings of the party** partiyanın sol və sağ qanadları arasında artan / artmaqda olan ziddiyyətlər; 2. bir-birinə zidd olan iki qütb; **the ~ of a magnit** maqnitin bir-birinə zidd olan iki qütbü

**polarization, -sation** [ˌpouləraɪˈzeɪʃn] *n* 1. *fiz.* polyarizasiya, polyarlaşma; *(1) işıq və elektromaqnit ehtizazlarının müəyyən bir sahədə yerləşmə qabiliyyəti; 2) elektrodlarda cərəyanın qüvvəsini zəiflədən müxtəlif maddələrin toplanması);* 2. qütbləşmə; **the ~ of attitudes / views** münasibətlərin / fikirlərin qütbləşməsi

**polarize, -ise** [ˈpouləraɪz] *v* 1. *fiz.* polyarlaşdırmaq *bax* **polarization**; 2. qütbləşdirmək; qütbləşmək *(fikirlərin, baxışların iki müxtəlif qütbdə toplanması); Public opinion has polarized on this issue Bu məsələdə ictimai fikir qütbləşib*

**polarizer, -iser** [ˈpouləraɪzəʳ] *n fiz.* polyarizator, işığı polyarizə edən cihaz

**Pole** [poul] *n* polyak; **the ~s** *top.i* polyaklar

**pole¹** [poul] *n* I 1. sütun, dirək, şalban; şüvül, uzun ağac; paya; **a telegraph ~** teleqraf şalbanı / dirəyi; **a tent ~** çadır payası; 2. xizək ağacı *(həm də* **ski ~***);* 3. *id.* hoppanmaq / tullanmaq üçün şüvül; 4. dişlə, çillə *(qoşqu aləti);* 5. dəstəli qarmaq / çəngəl; 6. *dən.* dor ağacı; **under / with bare ~s** yelkənsiz;

◊ **up the ~ 1)** çətin / çıxılmaz vəziyyətdə; **2)** ağlını itirmiş; **3)** sərxoş, kefli; **under bare ~s** çılpaq, paltarsız

**pole** [poul] *n* II 1. qütb; **the North / the South Pole** Şimal / Cənub qütbü; 2. *fiz.* maqnitin iki əks tərəfi / qütbü; elektrik batareyasının mənfi və müsbət qütbü / ucu; **from ~ to ~** qütbdən-qütbə, bütün dünyanı əhatə edən; 3. bir şeyin o birisinə tam əks olması; *We are as far apart as the poles Biz bir-birimizdən iki qütb qədər aralıyıq;*

◊ **to be ~s apart** çox fərqlənmək, başqa-başqa olmaq; *He and his brother are poles apart O və onun qardaşı tamam başqa-başqadır (yəni onlar bir-birindən çox fərqlənirlər)*

**pole²** [poul] *v* 1. paya vurmaq, dirək qoymaq; 2. şüvüllə və ya avarla itələmək; **to ~ a boat up the river** qayığı avarla çay yuxarı sürmək

**polemic¹** [pəˈlemɪk] *n* polemika, mübahisə, qələm münaqişəsi; **to engage in ~** polemikada / mübahisədə iştirak etmək

**polemic²** [pəˈlemɪk] *adj* polemik, mübahisəli; **a ~ article** mübahisəli məqalə; **a ~ speech** polemik nitq

**polemical** [pəˈlemɪkl] *adj* = **polemic²**

**polemicist** [pəˈlemɪsɪst] *n* polemikaçı, mübahisəçi, mübahisə sevən / həvəskarı

**polemize** [ˈpɔlɪmaɪz] *v* polemika açmaq, mübahisəyə girişmək, mübahisə açmaq

**pole-star** [ˈpoulstaːʳ] *n* qütb ulduzu

**police¹** [pəˈliːs] *n (adət.* **the police**; *Özündən sonra fel cəmdə işlənir)* polis; **the local / the state / the national ~** yerli / dövlət / milli polis; **railway/detective ~** dəmiryol / xəfiyyə polisi; *The police were there before we came Biz gəlməmişdən qabaq polis orada idi; The police have not made any arrests Polis heç kimi həbs etməyib*

**police²** [pəˈliːs] *adj* polis; **a ~ car** polis maşını; **a ~ report** polis məlumatı; **a ~ enquiry** polis istintaqı; **a ~ station** polis məntəqəsi; **a ~ officer** polis zabiti; *The suspected was taken to the nearest police station for questioning Şübhəli şəxs istintaq üçün ən yaxındakı polis məntəqəsinə aparıldı*

**police³** [pəˈliːs] *v* qayda-qanunu saxlamaq *(polisin köməyilə);* polis xidməti yerinə yetirmək; nəzarət etmək; *The teachers on duty are policing the school buildings during the lunch hour Lanç/Günorta yeməyi zamanı növbətçi müəllimlər məktəb binalarına nəzarət edirlər*

**policeman** [pəˈliːsmən] *n (pl* **-men** [-mən]) polis nəfəri *(kişi),* kişi polis

**policewoman** [pəˈliːswumən] *n (pl* **-women** [-ˌwɪmɪn]); *(qısa forması* **PW***)* polis nəfəri *(qadın),* qadın polis

**policlinic** [ˌpɔlɪˈklɪnɪk] *n* poliklinika *(xəstəxananın nəzdində)*

**policy** [ˈpɔlɪsɪ] *n* siyasət; **home/internal/domestic ~** daxili siyasət; **foreign ~** xarici siyasət; **long-range ~** uzunməqsədli siyasət; **wait-and-see ~** gözləmə siyasəti; **give-and-take ~** qarşılıqlı güzəşt siyasəti; **position-of-strength ~** güc mövqeyindən aparılan siyasət; **to follow / to pursue a ~** siyasət aparmaq / yeritmək;

◊ *Honesty is the best policy at. söz. Düzlük ən yaxşı siyasətdir*

**polio** [ˈpoulɪou] *n* 1. **poliomyelitis** *sözünün qısa forması;* 2. *tib.* poliomiyelit xəstəliyinə tutulma

**poliomyelitis** [ˈpoulɪoumaɪəˈlaɪtɪs] *n tib.* poliomiyelit *(yoluxucu uşaq iflici)*

**Polish¹** [ˈpoulɪʃ] *n* polyak dili

**Polish²** [ˈpoulɪʃ] *adj* Polşa; polyak; **the ~ language** polyak dili

**polish¹** [ˈpɔlɪʃ] *n* 1. pardaq, cila; pardaqlama, cilalama; **a table with a high ~** çox yaxşı pardaqlı /cilalanmış stol; 2. pardaqlama /cilalama üçün maddə; **furniture ~** mebel yağı; **floor ~** döşəmə mastikası; **shoe ~** ayaqqabı kremi; **to apply ~ to *smth.*** bir şeyi pardaqlamaq/ cilalamaq; **to give the floor a thorough ~** döşəməni yaxşıca cilalamaq/pardaqlamaq

**polish²** [ˈpɔlɪʃ] *v* 1. parıldatmaq, hamarlamaq, cilalamaq, pardaqlamaq; **to ~ the furniture** mebeli pardaqlamaq; **to ~ the floor** döşəməni pardaqlamaq; 2. təmizləmək *(ayaqqabını);* **to ~ shoes** ayaqqabını təmizləmək; **to ~ up 1)** sürtüb parlatmaq; *He polished up the handle of the door O, qapının dəstəyini sürtüb parlatdı;* **2)** təkmilləşdirmək, yaxşılaşdırmaq; **to ~ up *one's* English** ingilis dilindən biliyini təkmilləşdirmək / cilalamaq

**polished** [ˈpɔlɪʃt] *and* 1. cilalanmış, pardaqlanmış; işıldadılmış, hamarlanmış; **~ wood** pardaqlanmış / hamarlanmış ağac; **~ floor** pardaqlanmış döşəmə; 2. gözəl, zərif, nəfis, incə; **a ~ style** gözəl / zərif üslub; **~ manners** incə / zərif davranışlar

**polisher** [ˈpɔlɪʃəʳ] *n* 1. pardaqçı, cilalayıcı; cilalayıcı fəhlə; 2. pardaqlayıcı / cilalayıcı maşın; **a floor ~** döşəmə pardaqlayan maşın

**polishing** [ˈpɔlɪʃɪŋ] *n* cilalama, pardaqlama

**polite** [pəˈlaɪt] *adj (müq. dərəcəsi:* **-er**; *üst. dərəcəsi:* **-est**) 1. nəzakətli, ədəbli, tərbiyəli; **a ~ child** tərbiyəli / ədəbli uşaq; 2. kübar; **~ society** kübar cəmiyyət

**politely** [pəˈlaɪtlɪ] *adv* nəzakətlə, ədəblə; **to behave ~** ədəblə / nəzakətlə davranmaq; **to speak ~** ədəblə danışmaq

**politeness** [pəˈlaɪtnɪs] *n* nəzakət, nəzakətlilik; ədəb, ədəblilik, mərifət, mərifətlilik

**politic** [ˈpɔlɪtɪk] *adj* 1. ağıllı, kamallı, ehtiyatlı; 2. bic, fəndgir, çevik; öz xeyrini bilən; 3. xeyirli; ehtiyatlı, nəzakətli; **~ speech** nəzakətli nitq; **~ move** ehtiyatlı addım/ gediş

**political** [pəˈlɪtɪkl] *adj* siyasi; **~ parties** siyasi partiyalar; **~ rights** siyasi hüquqlar; **~ liberties** siyasi azadlıqlar; **a ~ system** siyasi sistem / quruluş; **~ crisis** siyasi böhran; **a ~ prisoner** siyasi dustaq; **~ geography** siyasi coğrafiya; **~ decision** siyasi qərar

**politically** [pəˈlɪtɪklɪ] *adv* siyasətcə, siyasət baxımından / nöqteyi-nəzərindən, siyasət cəhətindən; **~ correct** siyasətcə / siyasət baxımından düz

**politician** [ˌpɔlɪˈtɪʃn] *n* 1. siyasətçi, siyasətlə məşğul olan adam, siyasi xadim; 2. *amer.* siyasətbaz

**politicize, -ise** [pəˈlɪtɪsaɪz] *v* 1. siyasiləşdirmək; siyasi səciyyə vermək; 2. siyasətlə məşğul olmaq

**politicization, -sation** [pəˌlɪtɪsaɪˈzeɪʃn] *n* siyasiləşmə, siyasiləşdirmə, siyasi səciyyə vermə

**politics** [ˈpɔlɪtɪks] *n* siyasət; **party ~** partiya siyasəti; **foreign / domestic ~** xarici / daxili siyasət; **imperial/world ~** imperiya /dünya siyasəti; **to talk of ~** siyasətdən / siyasət haqqında danışmaq; *What are your politics Sənin / Sizin siyasətin / siyasətiniz nədir?*

**polity** [ˈpɔlɪtɪ] *n* 1. dövlət; 2. dövlət quruluşu

**poll¹** [poul] *n* 1. seçicilərin siyahısı; 2. səslərin sayılması *(seçkidə);* 3. verilmiş səslərin miqdarı / sayı, seçkinin nəticəsi; **to declare the ~** seçkinin nəticələrini elan etmək; **to be at the head of the ~** ən çox səs almaq / toplamaq; 4. səsə qoyma, səsvermə; **to go to the ~s** səsverməyə getmək; öz namizədliyini irəli sürmək; **exclusion of women from the ~** qadınları səsvermədən məhrum etmə; 5. *adət. pl* seçki məntəqəsi; 6. seçicilərin qeydə alınması

**poll²** [poul] *v* 1. səs vermək; **to ~ for a candidate** namizədə səs vermək; 2. səs almaq / toplamaq; *Mr. Brown polled over 3000 votes Cənab Braun 3000-dən artıq səs aldı/ topladı;* 3. seçicilərin siyahısına daxil etmək

**pollard¹** [ˈpɔləd, ˈpɔlaːd] *n* başı vurulmuş / budanmış ağac

**pollard²** [ˈpɔləd, ˈpɔlaːd] *v* ağacı budamaq, ağacın başını vurmaq

**poll-beast** [ˈpoulˈbiːst] *n* buynuzsuz heyvan

**poll-cow** [ˈpoulˈkau] *n* buynuzsuz inək

**polled** [pould] *adj* 1. buynuzsuz; 2. budanmış *(ağac haq.)*

**pollen¹** [ˈpɔlɪn] *n bot.* toz *(çiçəklərdə)*
**pollen²** [ˈpɔlɪn] *v bot.* tozlamaq, tozlandırmaq *(bitki çiçəklərini)*
**pollinate** [ˈpɔlɪneɪt] *v bot.* tozlandırmaq, tozlamaq *(bitki çiçəklərini)*
**pollination** [ˌpɔlɪˈneɪʃn] *n bot.* tozlanma, tozlandırma
**pollinator** [ˈpɔlɪneɪtəʳ] *n* **1.** tozlandırıcı *(bitkilərin tozlanmasına kömək edən həşəratlar, quşlar və s.)*; **2.** bitkiləri dərmanlamaq üçün cihaz
**polling** [ˈpoulɪŋ] *n* səsvermə; **heavy ~** çox səsvermə
**polling-booth** [ˈpoulɪŋbu:ð] *n* səsvermə kabinəsi
**polling-day** [ˈpoulɪŋdeɪ] *n* səsvermə günü; **a week before / after ~** səsvermə günündən bir həftə əvvəl / sonra
**polling-station** [ˈpoulɪŋsteɪʃn] *n* səsvermə məntəqəsi
**pollute** [pəˈlu:t] *v* **1.** çirkləndirmək, kirləndirmək; korlamaq; **to ~ water / air** suyu / havanı çirkləndirmək; **to ~ the minds of the young with foul propaganda** yaramaz / ziyanlı təbliğatla gənclərin beynini korlamaq; **2.** təhqir etmək, murdarlamaq; **to ~ a temple** məbədgahı / ibadətxananı murdarlamaq; **3.** mənəviyyatını / əxlaqını pozmaq, pis yola çəkmək, yoldan çıxartmaq
**pollution** [pəˈlu:ʃn] *n* **1.** çirkləndirmə; korlama; çirklənmə, korlanma; **the ~ of our beaches with oil** bizim çimərliklərin neftlə çirklənməsi / korlanması; **2.** zir-zibil, tullantı; *Beaches are covered with pollution Çimərliklər zir-zibillə / tullantılarla örtülüb*; **3.** təhqir, təhqir etmə, murdarlama *(xüs. müqəddəs yerləri)*; **4.** əxlaqını/mənəviyyatını pozma, yoldan çıxartma, pis yola çəkmə; pozğunlaşma, yolunu azma
**polo** [ˈpoulou] *n id.* polo *(at üstündə oynanılan top oyunu)*
**polonaise** [ˌpɔləˈneɪz] *n* polonez *(qədim polyak rəqsi və ya bu rəqs üçün yazılmış musiqi)*
**polonium** [pəˈlouniəm] *n kim.* polonium *(radioaktiv element)*
**polo-stick** [ˈpouloustɪk] *n* polo oynamaq üçün ağac, polo ağacı
**poltergeist** [ˈpɔltəgaɪst] *n* kabus, qarabasma, damdabaca, cin; xəyal, vahimə
**poly-** [ˈpɔlɪ-] *mürəkkəb sözlərin tərkib hissəsi: Azərbaycan türkcəsində* **çox** *və ya* **poli-** *tərkib hissələrinə müvafiq gəlir:* **poly**atomic **çox**atomlu; **poly**gyny **çox**arvadlılıq; **poly**-syllable **çox**hecalı sözlər; **poly**technic **poli**texnik; **poly**glot **poli**qlot
**polyandrious** [ˌpɔlɪˈændrəs] *adj* çoxərli
**polyandry** [ˌpɔlɪˈændrɪ] *n* çoxərlilik *(ibtidai cəmiyyətdə)*
**polyatomic** [ˌpɔləˈtɔmɪk] *adj* çoxatomlu
**polychord** [ˈpɔlɪkɔ:d] *adj* çoxsimli
**polygamia** [ˌpɔlɪˈgeɪmɪə] *n* poliqamiya, çoxarvadlılıq
**polygamic** [ˌpɔlɪˈgæmɪk] *adj* = **polygamous**
**polygamous** [pəˈlɪgæməs] *adj* poliqamik, çoxarvadlı; **~ marriage/society** çoxarvadlı nikah /cəmiyyət
**polygamy** [pəˈlɪgəmɪ] = **polygamia**
**polyglot¹** [ˈpɔlɪglɔt] *n* **1.** poliqlot *(çox dil bilən adam)*; **2.** eyni zamanda bir neçə dildə çap olunan kitab
**polyglot²** [ˈpɔlɪglɔt] *adj* çoxdilli; **a ~ dictionary** çoxdilli lüğət; **a ~ nation** çoxdilli / çox dildə danışan xalq
**polygon** [ˈpɔlɪgən] *n* çoxbucaqlı *(fiqur)*
**polygonal** [ˈpɔlɪgənəl] *adj* çoxbucaqlı
**polygraph** [pəˈlɪgra:f] *n* **1.** çox kitab yazan müəllif, məhsuldar yazıçı; **2.** çoxaldıcı / surətçıxaran aparat
**polygyny** [pəˈlɪdʒɪnɪ] *n* çoxarvadlılıq
**polymer** [ˈpɔlɪməʳ] *n kim.* polimer
**polyp** [ˈpɔlɪp] *n* **1.** *zool.* polip *(bağırsaq boşluqlular sinfindən olan dəniz heyvanı)*; **2.** *tib.* polip *(selikli qişada əmələ gələn şiş)*
**polysemantic** [ˌpɔlɪsɪˈmæntɪk] *adj dilç.* çoxmənalı; **~ words** çoxmənalı sözlər
**polysemy** [ˈpɔlɪsɪmɪ] *n dilç.* çoxmənalılıq; **~ of words** sözlərin çoxmənalılığı
**polysyllabic** [ˈpɔlɪsɪˈlæbɪk] *adj qram.* çoxhecalı; **~ words** çoxhecalı sözlər
**polysyllable** [ˈpɔlɪˌsɪləbl] *n qram.* çoxhecalı söz
**polysynthetic** [ˌpɔlɪˈsɪnθetɪk] *adj* polisintetik; **~ languages** polisintetik dillər
**polytechnic** [ˌpɔlɪˈteknɪk] *adj* politexnik; **~ schools** politexnik məktəblər
**polytheism** [ˈpɔlɪθɪɪzm] *n* çoxallahlılıq *(eyni zamanda bir çox allaha sitayiş etmə)*
**polytheist** [ˈpɔlɪθɪɪst] *n* politeist *(politeizmə inanan adam)*
**polytheistic** [ˌpɔlɪθɪˈɪstɪk] *adj* politeist, çoxallahlı
**polythene** [ˈpɔlɪθi:n] *n* polietilen
**pomade¹** [pəˈma:d] *n* pomada *(saç üçün)*
**pomade²** [pəˈma:d] *v* pomadalamaq, pomada sürtmək *(saça)*
**pomegranate** [ˈpɔmˌgrænɪt] *n bot.* nar
**pomegranate-tree** [ˈpɔmˌgrænɪtˈtri:] *n* nar ağacı
**pomp** [pɔmp] *n* təmtəraq, ehtişam, dəbdəbə, calal, büsat; qəşənglik, gözəllik
**pomposity** [pɔmˈpɔsɪtɪ] *n* **1.** calal, dəbdəbə, təntənə, təmtəraq, büsat, ehtişam; **2.** vüqar; lovğalıq, təşəxxüs, təkəbbür, özündən bədgümanlıq, özü haqqında böyük fikirdə olma; **3.** iddialı / lovğa / təkəbbürlü adam
**pompous** [ˈpɔmpəs] *adj* **1.** calallı, dəbdəbəli, təmtəraqlı, parlaq; çox gözəl/ qəşəng; **2.** lovğa, iddialı, məğrur, ibarəli; təkəbbürlü; **a ~ language** ibarəli / təmtəraqlı dil; **a ~ official** təkəbbürlü / lovğa məmur
**pompously** [ˈpɔmpəslɪ] *adv* **1.** çox gözəl / yaxşı, əla; **2.** təmtəraqla, lovğa-lovğa, təkəbbürlə, iddialı



**ponce¹** [pɔns] *n* **1.** fahişə ilə və onun qazancı hesabına yaşayan kişi; **2.** homoseksual kişi
**ponce²** [pɔns] *v* **1.** qadın kimi hərəkət etmək *(kişi haq.)*; **2.** küt/bacarıqsız olmaq; bir işi qaydasında görə bilməmək; **to ~ about /around** eşələnmək *(iş görmək əvəzinə)*; *Stop poncing about and get that job finished Eşələnməyi saxla / saxlayın və o işi qurtar / qurtarın*
**poncho** [ˈpɔntʃou] *n (pl* **-os** [-ouz]) ponço *(Mərkəzi və Cənubi Amerikada hinduların geyindiyi plaş / bürüncək)*
**pond** [pɔnd] *n* süni göl; gölcük, nohur; **a fish ~** balıq gölü; **a duck ~** ördək üçün gölməçə / nohur
**ponder** [ˈpɔndəʳ] *v* fikirləşmək, düşünmək, düşünüb-daşınmaq, ətraflı düşünmək, götür-qoy etmək; **to ~ a question** məsələni ətraflı düşünmək / götür-qoy etmək; *I've pondered long enough – it's time to decide Mən kifayət qədər düşünüb-daşınmışam/götür-qoy etmişəm, qərara gəlmək vaxtıdır*
**ponderous** [ˈpɔndərəs] *adj* **1.** ağır; iri, dolu, böyük; **~ axe** ağır balta; **~ figure** iri fiqura; **~ building** iri / böyük bina; **2.** cansıxıcı, usandırıcı, bezikdirici, darıxdırıcı, çox maraqsız; ağır başa düşülən *(üslub haq.)*; çətin, ağır *(tapşırıq haq.)*
**pony** [ˈpounɪ] *n* **1.** poni *(kiçikboylu at cinsi)*; **2.** *d.d.* kiçik qədəh *(spirtli içki içmək üçün)*; **~ of brandy** bir kiçik qədəh konyak; **3.** kiçik qabaritli avtomobil
**pony-tail** [ˈpounɪteɪl] *n* "atquyruğu" *(qadın saç düzümü)*
**poodle** [pu:dl] *n* pudel *(qıvrımtüklü it cinsi)*
**pool¹** [pu:l] *n* I **1.** gölməçə, nohur; **~ of blood** qan gölməçəsi; **2.** hovuz, çarhovuz *(çimmək üçün)*; **indoor ~** örtülü hovuz / çarhovuz
**pool** [pu:l] *n* II **1.** ümumi fond, birləşdirilmiş ehtiyat; **~ of foreign exchange** xarici valyutanın ümumi fondu; **dollar ~** birləşmiş dollar fondu; **a ~ of brilliant scientists** əla alimlər ehtiyatı; **2.** birləşmə, birlik, təşkilat, büro, ittifaq; **typewriting ~** makinaçılar bürosu
**pool²** [pu:l] *v* birləşdirmək; ümumi fondda birləşdirmək; bir yerə toplamaq; **to ~ resources** vəsaitləri ümumi fondda birləşdirmək; *They pooled their savings for a holiday abroad Onlar xaricdə dincəlmək üçün yığdıqları pullarını bir yerə topladılar; If we pool our ideas, we may find a solution Biz fikirlərimizi cəmləsək, çıxış yolu taparıq;* **to ~ foreign exchange** xarici valyutanın birləşmiş fondunu yaratmaq
**poor** [puəʳ] *adj* **(-er, -est) 1.** kasıb, yoxsul; **a ~ peasant** kasıb / yoxsul kəndli; **~ people** yoxsul adamlar; *She was too poor to buy clothes for her children O çox kasıb olduğundan uşaqlarına paltar ala bilmirdi*; **a ~ family** kasıb / yoxsul ailə; **2.** *d.d.* yazıq, binəva, bədbəxt; **~ beggar** yazıq / binəva dilənçi; **3.** az, yetərsiz; pis; **~ crop** az / pis məhsul; **~ income** az gəlir; **~ supply** yetərsiz təminat; **4.** keyfiyyətsiz; iyrənc, pis; **~ food** pis / iyrənc yemək / xörək; **~ butter** keyfiyyətsiz yağ; **goods of ~ quality** aşağı / pis keyfiyyətli mallar; **to have a ~ opinion of** ***smb.*** bir kəs haqqında pis fikirdə olmaq; **5.** zəif; **~ speaker** zəif natiq; **to be ~ at mathematics** riyaziyyatdan zəif olmaq; **6.** xoşagəlməyən, xoşagəlməz, çirkin, pis; *We had a poor time Biz vaxtımızı pis keçirdik*; **7.** qeyri-məhsuldar *(torpaq haq.)*; **8.** yararsız *(ərzaq haq.)*; **9.** zəif, pis *(səhhət haq.)*; **~ health** zəif səhhət / sağlamlıq; **~ horse** zəif at; **10. the ~** *top.i* kasıblar, yoxsullar;
◊ **~ as a church mouse** kilsə siçanı kimi yoxsul, lüm-lüt
**poorly** [ˈpuəlɪ] *adv* pis, yoxsul, kasıb; **~ clad** kasıb geyimli; **~ furnished room** kasıb mebel düzülmüş otaq; **~ lighted streets** pis işıqlandırılmış küçələr; *This street is poorly lit Bu küçə pis işıqlandırılır*; **to live ~** kasıb / yoxsul yaşamaq; **to think ~ of** ***smb.*** bir kəs haqqında pis fikirləşmək / pis fikirdə olmaq
**poorness** [ˈpuənɪs] *n* **1.** yoxsulluq, kasıblıq; **~ of supply** təminatın azlığı / kifayət etməməsi; **2.** münbitsizlik; **~ of the soil** torpağın münbitsizliyi; **3.** zəiflik *(səhhət haq.)*
**poor-spirited** [ˈpuəˈspɪrɪtɪd] *adj* qorxaq, ürəksiz, cəsarətsiz, ağciyər
**pop¹** [pɔp] *n* I **1.** partlama, partıldama, partıltı; çatırtı; **the ~ of a cork** probkanın partıltısı; **the ~ of a pistol** tapança atəşinin partıltısı; **2.** *d.d.* atəş; **to have a ~ at a hare** dovşana atəş açmaq; **3.** *d.d.* qazlı / qaynayan içki
**pop** [pɔp] *n* II *d.d.* **popular** *sözünün qısa forması*
**pop²** [pɔp] *adj*: **~ music** pop musiqisi; **~ songs** pop mahnılar
**pop³** [pɔp] *v* **(-pp-) 1.** partıldamaq, partlamaq, çartıldamaq; *The chestnuts popped in the ashes Şabalıdlar qorun içində partıldayırdı; The children were popping the balloons Uşaqlar şar partladırdılar*; **2.** *d.d.* atmaq *(tüfəng və s.)*, atəş açmaq *(həm də* **to ~ off**); **to ~ off a fox** tülküyə atəş açmaq; **3. (into)** soxmaq, tələsik qoymaq; **to ~ a cake into the oven** pirojnanı peçə qoymaq; **4 (out of)** çıxartmaq; **to ~** ***one's*** **head out of a window** başını pəncərədən çıxartmaq; **5.** hədəqəsindən çıxmaq *(göz haq.)*; *His eyes popped with amazement Heyrətdən onun gözləri hədəqəsindən çıxdı*; **to ~ down** yazmaq, qeyd etmək, cızmaq *(plan və s.)*; **to ~ down** ***one's*** **ideas on the paper** fikirlərini kağızda qeyd etmək; **to ~ in 1)** cəld soxmaq / dürtmək / tıxmaq; **2)** gözlənilmədən peyda olmaq / gəlmək; **to ~ off 1)** gözlənilmədən / qəflətən getmək; **2)** *d.d.* ölmək; **to ~ on** cəld geyinmək; gözünün üstünə basmaq *(papağı)*; **to ~ out 1)** gözlənilmədən / qəflətən çıxmaq; sıçrayıb çıxmaq; **2)**

**preacher** ['pri:tʃəʳ] *n* xətib, vaiz; təbliğçi
**preamble¹** [prɪ'æmbl] *n* preambula *(sazişin və s. giriş hissəsi); The phrase is explained in the preamble to the report Bu ifadə məruzənin preambula / giriş hissəsində izah edilir*
**preamble²** [prɪ'æmbl] *v* preambula / giriş yazmaq
**prearrange** ['pri:ə'reɪndʒ] *v* əvvəlcədən / əvvəldən hazırlamaq, əvvəlcədən / qabaqcadan planlaşdırmaq
**prearranged** [.pri:ə'reɪndʒd] *adj* əvvəlcədən / əvvəldən hazırlanmış, əvvəlcədən/ qabaqcadan planlaşdırılmış; **a ~ meeting** əvvəlcədən / qabaqcadan hazırlanmış iclas
**prearrangement** ['pri:ə'reɪndʒmənt] *n* əvvəlcədən /qabaqcadan hazırlıq, əvvəlcədən / qabaqcadan razılıq
**precapitalist** [.pri:'kæpɪtəlɪst] *adj* kapitalizmdən əvvəlki / qabaqkı
**precarious** [prɪ'keərɪəs] *adj* **1.** etibarsız; şübhəli; təsadüfi; **~ inference** şübhəli nəticə; **to make a ~ living** təsadüfi gəlirlə yaşamaq; **2.** təhlükəli; **to be in a ~ situation** təhlükəli vəziyyətdə olmaq; **~ foothold** etibarsız dayaq; **3.** əsaslandırılmamış; əsassız, sübutsuz; **~ argument** əsassız dəlil / sübut
**precariously** [prɪ'keərɪəslɪ] *adv* bir təhər, güclə; **to live ~** bir təhər dolanmaq / yaşamaq
**precaution** [prɪ'kɔ:ʃn] *n* ehtiyat, tədbir, ehtiyat tədbiri; ehtiyatlılıq, tədbirlilik; **to take ~s against fire** yanğına qarşı tədbirlər görmək; **to take an umbrella just as a ~** ehtiyat olaraq çətir götürmək; *She took an umbrella just as a precaution Ehtiyat olaraq o, çətir götürdü*
**precautionary** [prɪ'kɔ:ʃnərɪ] *adj* ehtiyat olaraq qəbul edilmiş, ehtiyatlı, tədbirli; **~ measures** ehtiyat tədbirləri; **to take ~ measures** ehtiyat tədbirləri görmək
**precautious** [prɪ'kɔ:ʃəs] *adj* ehtiyatlı, tədbirli
**precede** [prɪ'si:d] *v* **1.** qabaq / qabaqca olmaq, əvvəl/əvvəlcə gəlmək; **the calm that ~s a storm** tufandan əvvəlki / qabaqkı sakitlik; *The conference was preceded by a reception Konfransdan əvvəl qəbul mərasimi keçirildi*; **2.** qabaqda olmaq / getmək; *The regiment was preceded by its band Polkun qabağında orkestr gedirdi*; **3.** üstün / vacib olmaq; *This task now precedes every other problem Bu məsələ indi hər bir problemdən vacibdir*
**precedence** [pri:'si:dəns] *n* **1.** əvvəldə / qabaqda gəlmə; birinci növbədə durma, təxirəsalınmazlıq; üstünlük, üstün tutma; birincilik; **to take / to have ~ of** ***smth.*** bir şeydən əvvəl / qabaq gəlmə; *Financial measures take precedence of other matters Maliyyə tədbirləri birinci növbədə müzakirə edilir*; **2.** yaşa görə böyüklük/ üstünlük, staja/vəzifəyə/rütbəyə görə birincilik; **to take/to have ~ of** ***smb.*** vəzifəyə/ rütbəyə görə bir kəsdən üstün olmaq; **3.** üstünlük; *People who arrive first should have precedence Birinci gələn adamlar üstünlüyə malik olmalıdır*
**precedent¹** ['presɪdənt] *n* presedent; misal; örnək, nümunə; **to set / to create a ~** presedent yaratmaq; **to invoke a ~** presedentə / misala əsaslanmaq; **without ~** misilsiz, görünməmiş, tayıbərabəri olmayan
**precedent²** [prɪ'si:dnt] *adj* qabaqkı, əvvəlki, keçən; **~ events** əvvəlki hadisələr; **~ chapter** əvvəlki fəsil
**precedently** [prɪ'si:dəntlɪ] *adv* əvvəllər, keçmişdə, əvvəlcə, qabaqca
**preceding** [prɪ'si:dɪŋ] *adj* qabaqkı, əvvəlki, keçən; **the ~ chapter** əvvəlki fəsil
**precept** ['pri:sept] *n* **1.** öyüd, nəsihət; öyüd / nəsihət vermə; hüquq, haqq; göstəriş, göstəriş vermə; **to teach by example rather than by ~** öyüd/nəsihət verməklə deyil, şəxsi nümunə əsasında öyrətmək; **2.** məhkəməyə çağırma / çağırış vərəqi
**preceptor** [prɪ'septəʳ] *n* müəllim, mürəbbi, rəhbər
**precinct** ['pri:sɪŋkt] *n* **1.** binanın ətrafında hasarlanmış / hasara alınmış sahə *(xüs. kilsənin)*; **2.** *pl* şəhərin ətrafı / kənarı; **3.** sərhəd, hüdud; **within the city ~** şəhər sərhədləri / hüdudları daxilində
**precious¹** ['preʃəs] *adj* **1.** qiymətli; **~ stones** qiymətli daşlar; **~ time** qiymətli vaxt; **~ knowledge** qiymətli bilik; *Gold and silver are precious metals Qızıl və gümüş qiymətli metaldır*; **2.** əziz, istəkli, sevimli; **~ recollections** əziz xatirələr; *My precious darling Mənim əzizim; She is very precious to me O mənim üçün çox əzizdir*; **3.** ədalı, şivəli; gözəl, zərif, incə *(dil və s. haq.)*; **a rather ~ young man** bir qədər ədalı cavan oğlan
**precious²** ['preʃəs] *adv* (**little, few** *sözləri qarşısında işlədilir)* çox; *Precious few people can afford prices like that Belə qiymətlərə çox az adamların gücü çata bilər*
**preciousness** ['preʃəsnɪs] *n* qiymət, dəyərlilik, əzizlik; **the ~ of an old friendship** köhnə dostluğun qiyməti / dəyəri
**precipice** ['presəpɪs] *n* **1.** uçurum, yarğan, sıldırım; **2.** *məc.* təhlükəli vəziyyət; **to stand on the brink of a ~** uçurumun kənarında dayanmaq, təhlükəli vəziyyətdə olmaq
**precipitate¹** [prɪ'sɪpɪtət] *adj* **1.** çox tələsik/sürətli/iti / cəld; **~ flight** çox tələsik qaçma; **~ movement** çox iti/cəld hərəkət; **2.** gözlənilməz, gözlənilməyən, birdən, qəfildən, ani; **~ action** gözlənilməz hərəkət, qaçaqaç
**precipitate²** [prɪ'sɪpɪteɪt] *v* **1.** devirmək, yıxmaq; **2.** cəlb/düçar/giriftar etmək; **to ~ a country into war** ölkəni müharibəyə cəlb etmək; *The assassination of the president precipitated the country into war Prezidentə sui-qəsd ölkəni müharibəyə düçar etdi*; **3.** sürətləndirmək, tezləşdirmək, tələsdirmək; **to ~ a crisis** böhranı sürətləndirmək /tezləşdirmək; **to ~ matters** hadisələrin gedişini sürətləndirmək; **4.** *kim.* çökmək, çökdürmək
**precipitation** [prɪ.sɪpɪ'teɪʃn] *n* **1.** devirmə, devrilmə; yıxma, yıxılma; sürətlə düşmə; **2.** itilik, sürətlilik, tezlik; **3.** tələsiklik; ehtiyatsızlıq; **to act with ~** tələsik / ehtiyatsız hərəkət etmək; **4.** tezləşdirmə, tezləşmə; sürətləndirmə, sürətini artırma; yaxınlaşdırma, yaxınlaşma; *This gave precipitation to his downfall Bu onun süqutunu tezləşdirdi*; **5.** *kim.* çökmə, çöküntü vermə
**precipitous** [prɪ'sɪpɪtəs] *adj* **1.** sıldırımlı, uçurumlu; sıldırım, yalçın, dimdik, dik; **~ cliffs** sıldırım / yalçın / dik qayalar; **~ slope** uçurumlu eniş; **2.** gözlənilməz, qəfil; **a ~ fall** qəfil yıxılma / düşmə; **a ~ drop in grain prices** taxılın qiymətinin qəfil/gözlənilməz aşağı düşməsi
**précis** ['preɪsi:] *n fr.* *(pl* **precis** [-si:z]) konspekt, referat, xülasə
**precise¹** [prɪ'saɪs] *adj* **1.** dəqiq, düz, müəyyən; **~ measurements** dəqiq ölçülər; **the ~ meaning** dəqiq/düz məna; **~ definition** dəqiq tərif; **to arrive at the ~ moment** dəqiq/düz vaxtında gəlmək; **2.** səliqəli, diqqətli; *He was very precise about doing his duty O öz vəzifəsini yerinə yetirməkdə çox səliqəli / dəqiq idi*; **3.** aydın *(səs və s. haq.)*
**precise²** [prɪ'saɪs] *v* dəqiqləşdirmək, müəyyənləşdirmək, dürüstləşdirmək
**precisely** [prɪ'saɪslɪ] *adv* dürüst, düz, aydın surətdə, aydın, aşkar; **at 2 o'clock ~** düz saat 2-də; *I can't remember precisely what happened Nə baş verdiyini aydın xatırlaya bilmirəm; That is precisely what I mean Mənim nəzərdə tutduğum dürüst budur*
**preciseness** [prɪ'saɪsnɪs] *n* dəqiqlik, dürüstlük, doğruluq; sərrastlıq, aydınlıq
**precisian** [prɪ'sɪʒn] *n* pedant, xırdaçı, vasvası, rəsmiyyətçi, formalist
**precision¹** [prɪ'sɪʒn] *n* **1.** dəqiqlik, dürüstlük, düzgünlük; **mathematical ~** riyazi dəqiqlik; **~ in calculation** hesablamada dəqiqlik / dürüstlük; **~ in movement** hərəkətdə dəqiqlik; **~ of expression** ifadənin dəqiqliyi/düzgünlüyü /doğruluğu; **2.** səliqə, səliqəlilik; **3.** sərrastlıq
**precision²** [prɪ'sɪʒn] *adj* dəqiq, dürüst, sərrast; **~ balance** dəqiq / dürüst tərəzi; **~ instrument** dəqiq cihaz; **~ tools** dəqiq alətlər; **~ bombing** *hərb.* dürüst / sərrast bombalama; **~ fire** *hərb.* sərrast atəş
**pre-cited** ['pri:saɪtɪd] *adj* yuxarıda göstərilmiş / xatırladılmış
**preclude** [prɪ'klu:d] *v* **1.** qabağını / qarşısını almaq; aradan qaldırmaq, yox / kənar etmək; **to ~ any chance of failure** uğursuzluğa səbəb ola biləcək hər şeyi aradan qaldırmaq; **to ~ all doubts** bütün şübhələri aradan qaldırmaq; **2.** mane olmaq, əngəl/çətinlik törətmək; *This precluded me from performing my task Bu, vəzifəmi yerinə yetirməyə mənə mane oldu*; **to be ~d from an opportunity** imkandan məhrum olmaq
**precocious** [prɪ'kouʃəs] *adj* **1.** görənəkli, yaşına görə çox inkişaf etmiş; **a ~ child** yaşına görə çox inkişaf etmiş uşaq; *Their precocious daughter can play the piano at the age of three Onların görənəkli qızı üç yaşında piano çalmağı bacarır*; **2.** erkən inkişaf etmiş; **~ talent** erkən inkişaf etmiş istedad; **~ maturity** erkən yetkinlik; **3.** *k.t.* tezdəyən *(meyvə)*, tezböyüyən *(heyvan)*
**precociousness** [prɪ'kouʃəsnɪs] *n* vaxtından tez yetişmə / inkişaf etmə
**preconceive** ['pri:kən'si:v] *v* özündə əvvəlcədən fikir / rəy yaratmaq
**preconceived** ['pri:kən'si:vd] *adj* əvvəlcədən / qabaqcadan müəyyənləşmiş / yaradılmış *(fikir, rəy, inam)*
**preconception** ['pri:kən'sepʃn] *n* əvvəlcədən yaradılmış/ müəyyənləşdirilmiş fikir/rəy, qabaqcadan əmələ gəlmiş yanlış fikir / rəy *(bir şey və ya şəxs haq.)*
**preconcert** ['pri:kən'sə:t] *v* razılaşmaq, sazişə gəlmək, düzəlişmək, ilkin razılığa gəlmək
**precursor** [prɪ'kə:səʳ] *n* sələf; müjdəçi, xəbərçi
**predate** [.pri:'deɪt] *v* əvvəlki tarixi qoymaq
**predator** ['predətəʳ] *n* **1.** yırtıcı, vəhşi *(heyvan)*; **2.** *məc.* istismarçı, qansoran, soyğunçu
**predatory** ['predətərɪ] *adj* **1.** soyğunçu, qarətçi, talançı, quldur; **~ war** soyğunçu müharibə; **~ bands** soyğunçu / talançı bandalar; **2.** yırtıcı, qansoran; **~ birds** yırtıcı quşlar; **~ insects** qansoran həşəratlar
**predecease** [.pri:dɪ'si:s] *v* əvvəlcə ölmək *(bir kəsdən); Most men predecease their wives Əksər kişilər arvadlarından əvvəl / qabaq ölürlər*
**predecessor** ['pri:dɪserəʳ] *n* **1.** sələf; **my ~ in office** bu işdə mənim sələfim *(məndən əvvəl bu vəzifədə işləyən)*; **2.** özündən əvvəlki hər hansı bir şey; *My present car is far superior to its predecessor Mənim indiki maşınım əvvəlki maşınımdan xeyli üstündür*
**predestination** [.pri:destɪ'neɪʃn] *n* tale, qismət, bəxt, alın yazısı; qabaqcadan müəyyən etmə / edilmə
**predestine** [pri:'destɪn] *v* irəlicədən / qabaqcadan müəyyən etmək
**predestined** [pri:'destɪnd] *adj* tale tərəfindən müəyyən edilmiş; *They were predestined to spend their lives together Onların birgə həyat sürməsi taleyin işidir / qismətidir*
**predetermination** ['pri:dɪ.tə:mɪ'neɪʃn] *n* irəlicədən/qabaqcadan müəyyən etmə/edilmə
**predetermine** ['pri:dɪ'tə:mɪn] *v* irəlicədən/qabaqcadan müəyyən etmək, irəlicədən qərara almaq/qərar qəbul etmək

**predicament** [prɪ'dɪkəmənt] *n* çətin / xoşagəlməyən vəziyyət; **to be in an awkward ~** çətin /müşkül vəziyyətdə olmaq

**predicate**[1] ['predɪkət] *n qram.* xəbər

**predicate**[2] ['predɪkeɪt] *v* təsdiq etmək; əsaslandırmaq; elan etmək, bəyanat vermək

**predication** [ˌpredɪ'keɪʃn] *n* **1.** təsdiq, təsdiq etmə / edilmə, təsdiqləmə; **2.** *qram.* predikasiya

**predicative** [prɪ'dɪkətɪv] *adj qram.* predikativ *(xəbərin ad hissəsi)*

**predict** [prɪ'dɪkt] *v* qabaqcadan xəbər vermək, gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan/əvvəlcədən bildirmək; **to ~ the future** əvvəlcədən gələcəyi xəbər vermək

**predicted** [prɪ'dɪktɪd] *adj* qabaqcadan /əvvəlcədən xəbər verilmiş

**prediction** [prɪ'dɪkʃn] *n* qabaqcadan demə, gələcəyi xəbər vermə; proqnoz; peyğəmbərlik etmə

**predictor** [prɪ'dɪktəʳ] *n* peyğəmbər, rəsul; gələcəkdən xəbər verən

**predilection** [ˌpri:dɪ'lekʃn] *n* meyl, həvəs; üstün tutma; üstünlük; **to have a natural ~ for** ***smth.*** bir şeyə təbii meyli / həvəsi olmaq; **to have a ~ for classical music** klassik musiqini sevmək

**predispose** [pri:dɪs'pouz] *v* təsir altına salmaq, inandırmaq, razı / təhrik etmək; **to ~** ***smb.*** **in favour of doing** ***smth.*** bir kəsi bir iş görməyə razı salmaq / təhrik etmək

**predominance** [prɪ'dɔmɪnəns] *n* üstünlük; artıqlıq; hökmranlıq; **American ~ in space research** kosmosun tədqiqində Amerikanın üstünlüyü; *There is a predominance of apple trees in this area Bu sahədə alma ağacları üstünlük təşkil edir / daha çoxdur*

**predominant** [prɪ'dɔmɪnənt] *adj* üstün, üstün olan, üstünlük təşkil edən, ən çox təsadüf edilən, əsas; **the ~ opinion in the party** partiyada olan aparıcı /üstün / əsas fikir; *The socialists were predominant in the last Parliament Sonuncu parlamentdə sosialistlər üstünlük təşkil edirdilər*; **the ~ feature** əsas xüsusiyyət

**predominantly** [prɪ'dɔmɪnəntlɪ] *adv* əsasən, başlıca olaraq; **a ~ English-speaking population** əsasən ingiliscə danışan əhali; *The votes were predominantly in favour of the government Səslər əsasən hökumətin xeyrinə idi*

**predominate** [prɪ'dɔmɪneɪt] *v* **1.** üstün olmaq, çoxluq / üstünlük təşkil etmək; *Oak trees predominate in this forest Bu meşədə palıd ağacları çoxluq təşkil edir*; **2.** ağalıq/hökmranlıq etmək; hakim olmaq; *In his mind a wish to become rich had always predominated Dövlətli olmaq arzusu onun fikrinə həmişə hakim olmuşdur*

**pre-eminence** [pri:'emɪnəns] *n* üstünlük; müstəsnalıq

**pre-eminent** [pri:'emɪnənt] *adj* hamıdan üstün, görkəmli, məşhur; müstəsna; qeyri-adi; **a scintist ~ in his field** öz sahəsində məşhur / görkəmli alim

**pre-eminently** [pri:'emɪnəntlɪ] *adv* son dərəcə; hamıdan üstün; əsasən; başlıca olaraq; *She is a musician who plays several instruments, but she is pre-eminently a pianist O, bir neçə musiqi alətində çalan musiqiçidir, lakin əsasən / başlıca olaraq pianoçudur*

**pre-empt** [pri:'empt] *v* **1.** hamıdan tez / əvvəl/qabaq almaq; **2.** başqalarından əvvəl/qabaq sahib olmaq *(bir şeyə)*; **to ~ a seat** başqalarından əvvəl / qabaq yer tutmaq

**pre-emption** [pri:'empʃn] *n* **1.** satın almaq üçün üstün hüquq; **2.** *d.d.* tutma, işğal, istila; **3.** torpaq almağa dövlət tərəfindən verilmiş hüquq

**preen** [pri:n] *v* **1.** dimdiyi ilə tükünü təmizləmək *(quş haq.)*; **2.:** **to ~ oneself** bəzənmək, özünü bəzəmək, bəzənib-düzənmək; **3.** *məc.* özü ilə fəxr etmək, özündən razı olmaq, öyünmək, lovğalanmaq, iddia satmaq

**preface**[1] ['prefɪs] *n* müqəddimə, giriş, giriş sözü

**preface**[2] ['prefɪs] *v* **1.** müqəddimə / giriş yazmaq; müqəddimə / giriş vermək; **to ~ a book by / with a life of the author** kitaba müəllifin həyatına dair giriş yazmaq; **2.** qabaqcadan /əvvəlcədən fikir söyləmək

**prefatory** ['prefətərɪ] *adj* giriş; qabaqcadan/əvvəlcədən olan, ilkin; **a ~ note** ilkin qeyd, giriş sözü

**prefect** ['pri:fekt] *n* prefekt *(qədim Romada, indi Fransada və başqa ölkələrdə müxtəlif mülki, hərbi və polis vəzifələrinin adı)*

**prefecture** ['pri:fektjuəʳ] *n* prefektura *(1) prefekt vəzifəsi, prefektlik; 2) prefektin idarə etdiyi əyalət və ya başçılıq etdiyi idarə)*

**prefer** [prɪ'fə:ʳ] *v* **(-rr-)** **1.** istəmək, üstün tutmaq; daha yaxşı bilmək, üstünlük vermək; *They preferred to die rather than surrounder Onlar mühasirəyə alınmaqdan ölümü daha üstün tutdular; Would you like meat or fish? I'd prefer meat, please Sən / Siz ət yoxsa, balıq istəyirsən? / istəyirsiniz? – Zəhmət olmasa, mənə ət ver / verin*; **2.** vermək, təqdim etmək; **to ~ a question / a complaint** sual / şikayət vermək; **to ~ a charge against** ***smb.*** bir kəsə qarşı ittiham qaldırmaq

**preferable** ['prefərəbl] *adj* daha üstün tutulan, üstün tutulmağa layiq, daha yaxşı; *A dark suit is preferable to a light one for evening wear Axşam geyinmək üçün qara kostyum açıq rəngli kostyuma nisbətən daha üstün tutulur; He finds country life infinitely preferable to living in the city O, kənd həyatını şəhərdə yaşamaqdan sonsuz dərəcədə üstün hesab edir*

**preferableness** ['prefərəblnɪs] *n* üstünlük, üstün olma/tutma, daha çox arzu olunma

**preferably** ['prefərəblɪ] *adv* üstün tutaraq, daha yaxşı / üstün hesab edərək

**preference** ['prefərəns] *n* **1.** üstün tutma, üstünlük; **to give** ***smth.*** **the ~ over the other** bir



şeyi digərindən üstün tutmaq; **to have a ~ for poetry over prose** poeziyanı nəsrdən üstün tutmaq; **2.** seçmə, seçim; *What is your preference? Sən / Siz nəyi üstün tutursan? / tutursunuz? Sənin / Sizin seçimin / seçiminiz nədir?* **3.** *iqt.* imtiyaz; imtiyazlı gömrük rüsumu

**preferential** [ˌprefe'renʃl] *adj* **1.** üstün tutulan, üstünlük verilən; **2.** imtiyazlı; **~ duties** imtiyazlı rüsumlar; **~ tariff** imtiyazlı gömrük tarifi

**preferentially** [ˌprefe'renʃəlɪ] *adv* imtiyazla, üstün tutulmaqla, üstünlük verilməklə

**prefix**[1] ['pri:fɪks] *n* **1.** *qram.* prefiks, önlük, ön şəkilçi; **2.** *xüsusi adların qarşısında işlədilən titul, ad, rütbə və s.*: **Sir, Dr, Mr** və s. kimi

**prefix**[2] [pri:'fɪks] *v* **1.** *qram.* sözə birləşdirmək/əlavə etmək, sözün əvvəlində işlətmək; *In English we generally prefix the definite article to the names of rivers İngilis dilində biz ümumiyyətlə çay adları qarşısında müəyyənlik artikli işlədirik*; **2.** xüsusi adların qarşısında titul, rütbə və s. işlətmək; **3.** müqəddimə / giriş yazmaq *(kitaba və s.)*; **to ~ a title to a book** kitaba ad vermək; **to ~ an epigraph to chapter I** I fəslə epiqraf vermək

**prefixion** [prɪ'fɪkʃn] *n qram.* prefiksiya, sözə prefiks / ön şəkilçi əlavə etmə

**preform** [pri:'fɔ:m] *v* **1.** əvvəlcədən formaya salmaq/düzəltmək; **2.** əvvəlcədən/qabaqcadan müəyyənləşdirmək

**pregnancy** ['pregnənsɪ] *n* **1.** hamiləlik, hamilə olma *(qadın haq.)*; boğazlıq, boğaz olma *(heyvan haq.)*; **the late stages of ~** hamiləliyin son dövrləri *(qadınlarda)*, boğazlığın son dövrləri *(heyvanlarda)*; *These drugs should not be taken during pregnancy Hamiləlik dövründə bu dərmanları qəbul etmək olmaz*; **2.** təxəyyülün / təsəvvürün gücü; fərasət, zəka, zirəklik, tez başa düşmə; **3.** məzmunluluq; inandırıcılıq, tutarlılıq *(nitqdə və s.)*

**pregnant** ['pregnənt] *adj* **1.** hamilə *(qadın)*, boğaz *(heyvan)*; **a ~ woman** hamilə qadın; **a ~ cow** boğaz inək; *My wife is pregnant Mənim arvadım hamilədir; She is six months pregnant O, altı aydır hamilədir*; **2.** fərasətli, bacarıqlı, zirək; yaradıcı; **~ mind / wit** yaradıcı alim / mütəfəkkir; **3.** məzmunlu, mənalı; **a speech weighty and ~** samballı və məzmunlu nitq; **4.** *arx.* münbit; **the ~ fields** münbit əkin yerləri

**preheat** [pri:'hi:t] *v* əvvəlcədən / qabaqcadan qızdırmaq *(sobanı və s.)*

**prehistoric** [ˌpri:'hɪstɔrɪk] *adj* tarixdən əvvəlki / qabaqkı; **in ~ times** tarixdən əvvəlki / qabaqkı vaxtlar; **~ man / graves / cave** tarixdən əvvəlki adam / qəbirlər / mağara; **~ paintings** tarixdən əvvəl çəkilmiş şəkillər

**prehistory** [ˌpri:'hɪstrɪ] *n* tarixdən əvvəlki/qabaqkı dövr

**prejudge** [ˌpri:'dʒʌdʒ] *v* **1.** əvvəlcədən / qabaqcadan qiymətləndirmək, qabaqcadan həll etmək / qərar vermək; **to ~ a question** məsələni əvvəlcədən / qabaqcadan həll etmək; **2.** *hüq.* məhkəmədə işə baxmazdan əvvəl / qabaq hökm vermək

**prejudice**[1] ['predʒudɪs] *n* **1.** ədalətsiz / insafsız /tərəfgir / qərəzli fikir; **without ~** qərəzsiz olaraq, tərəfgirlik etmədən, insafla; **to have a ~ against** ***smth.*** bir şeyə qarşı qərəzli olmaq; **a ~ in favour of** ***smb.*** bir kəsə qarşı üzgörə / tərəfgir münasibət; **2.** xurafat, mövhumat, zehniyyət; **to be steeped in ~** mövhumatda batıb qalmaq; **3.** məhkəmənin ədalətsiz qərarı nəticəsində dəymiş ziyan / zərər; ədalətsizlik; **to the ~ of** ***smb.*** bir kəsin ziyanına / zərərinə

**prejudice**[2] ['predʒudɪs] *v* **1.** qabaqcadan inandırmaq / beyninə yeritmək / təlqin etmək; qərəzli fikir yaratmaq *(bir kəsdə)*; **to ~** ***smb.*** **against** ***smb.*** bir kəsi bir kəsə qarşı qoymaq; **to ~** ***smb.*** **in favour of** ***smb. / smth.*** bir kəsdə bir kəsin / şeyin xeyrinə əvvəlcədən rəğbət doğurmaq; **2.** ziyan/zərər vurmaq; azaltmaq *(şansı, imkanı və s.)*; **to ~ one's chances of success** müvəffəqiyyət qazanmaq üçün öz şansını/imkanını azaltmaq; **3.** xarab etmək, korlamaq, yararsız hala salmaq

**prejudicial** [ˌpredʒu'dɪʃl] *adj* ziyan / zərər gətirən, ziyanlı, zərərli; **a course of action ~ to our interest** bizim marağımıza ziyan/zərər gətirən hərəkətlər; **~ to national security** milli təhlükəsizliyə ziyanlı / zərərli

**prelate** ['prelət] *n* prelat *(katolik kilsəsində yüksək ruhani vəzifələrindən birinin adı)*

**preliminary**[1] [prɪ'lɪmɪnərɪ] *n* **1.** *(adət. pl)* hazırlıq tədbiri, ilk addım; **2.** ilk / ilkin danışıqlar; sülh müqaviləsi bağlamaq haqqında aparılan ilk danışıqlar və ya saziş; **preliminaries to a conference** konfransdan / iclasdan əvvəl ilk / ilkin danışıqlar; **preliminaries of peace** sülh müqaviləsi bağlamaq haqqında aparılan ilk danışıqlar və ya saziş

**preliminary**[2] [prɪ'lɪmɪnərɪ] *adj* ilk, ilkin; əvvəlcədən / qabaqcadan olan, hazırlıq üçün olan; **~ negotiations** ilkin danışıqlar; **~ notice** qabaqcadan xəbər vermə / bildirmə; **~ examination** 1) qəbul imtahanı; 2) *hüq.* ilkin dindirmə / istintaq / sorğu-sual

**prelude** ['prelju:d] *n* **1.** giriş, başlanğıc, müqəddimə; **2.** *mus.* prelüdiya *(kiçik musiqi əsəri)*

**premarital** [ˌpri:'mærɪtl] *adj* kəbindən /evlənmədən əvvəl/qabaq; **~ sex** kəbindən əvvəlki cinsi əlaqə

**premature** [ˌpremə'tjuəʳ] *adj* vaxtından əvvəl / qabaq; vaxtsız, tez; **~ birth / labour** vaxtından əvvəl / qabaq doğuş; *The baby was five weeks premature Uşaq beş həftə əvvəl doğuldu / anadan oldu*; **~ death** vaxtsız ölüm; **the ~ closing of the exhibition** sərginin vaxtından əvvəl / qabaq bağlanması; *I think it's premature for us to talk about*

*sending troops in Mən düşünürəm ki, bizim qoşun göndərmək haqqında danışığımız tezdir*
**prematurely** [ˌpreməˈtjuəlı] *adv* tez, vaxtından əvvəl / qabaq; **to be born ~** vaxtından əvvəl / qabaq doğulmaq; **to die ~** vaxtsız ölmək
**premeditate** [ˌpri:ˈmedıteıt] *v* əvvəlcədən/qabaqcadan fikirləşmək/götür-qoy etmək; *All his words are premeditated Onun deyəcəyi bütün sözlər əvvəlcədən / qabaqcadan düşünülüb*
**premeditated** [ˌpri:ˈmedıteıtıd] *adj* əvvəlcədən / qabaqcadan düşünülmüş/götür-qoy edilmiş; qəsdən, qəsdlə edilən/edilmiş; **a ~ decision** əvvəlcədən / qabaqcadan düşünülmüş qərar; **~ murder** qəsdən edilmiş qətl, qəsdən öldürmə
**premeditation** [pri:ˌmedıˈteıʃn] *n* qəsdən / bilə-bilə/qərəzlə edilmə; niyyət, qəsd, məqsəd; **with ~** qəsdən, qəsdlə, qərəzlə, bilərəkdən, müəyyən məqsədlə
**premie** [ˈpri:mı] *n amer. d.d.* vaxtından tez doğulmuş uşaq
**premier**[1] [ˈpremıəʳ, amer. prıˈmıəʳ] *n* baş nazir; **The French ~** Fransanın baş naziri
**premier**[2] [ˈpremjəʳ] *adj* əsas, baş; birinci; **to take (the) ~ place** birinci yer tutmaq
**première**[1] [premˈjeəʳ] *n fr teatr.* **1.** premyera *(pyesin teatrda ilk tamaşası)*; **2.** baş rollarda oynayan aktrisa, aparıcı aktrisa
**première**[2] [premˈjeəʳ] *v* premyera tamaşası vermək; *His symphony was premièred in Boston Onun simfoniyasının premyerası Boston şəhərində oldu*
**premiership** [ˈpremjəʃıp] *n* baş nazirlik vəzifəsi
**premise**[1] [ˈpremıs] *n* **1.** *mənt.* mühakimə; **major ~** əsas /təsirli mühakimə; **minor ~** kiçik/xırda mühakimə; **2.** ilk/ilkin şərt; ilk/ilkin şərait; yuxarıda verilən/ göstərilən
**premise**[2] [prıˈmaız] *v* **1.** müqəddimə / giriş vermək, müqəddimə/giriş şəklində söyləmək; **to ~ a book with a few general remarks** kitaba bir neçə ümumi qeydlə giriş yazmaq; **2.** *mənt.* mühakimədən çıxış etmək; **3.** *tib.* bir şeylə müalicəyə başlamaq
**premises** [ˈpremısız] *n (Özündən sonra fel cəmdə işlədilir) bina, ev, mənzil və onlara aid olan torpaq və digər tikililər*
**premium**[1] [ˈpri:mıəm] *n* **1.** mükafat, bəxşiş; bəxşiş / mükafat vermə; **to put a ~ on smth.** bir şey verməklə həvəsləndirmək /şirnikləndirmək; **2.** sığorta pulu; **3.** *mal.* əlavə etmə, artırma *(alver-də)*; **4.** öyrənmə üçün muzd *(bir sənətə və s.)*;
◊ **at a ~** çox tələb olunan; çox dəbdə olan
**premium**[2] [ˈpri:mıəm] *adj* **1.** çox yüksək *(qiymətdə və s.)*; **~ rents** çox yüksək ev kirayəsi; **2.** yüksək keyfiyyətli; **~ wines** yüksək keyfiyyətli şərablar
**premonition** [ˌpri:məˈnıʃn] *n* **1.** xəbərdarlıq, xəbərdar etmə; ehtiyat tədbiri; **2.** qabaqcadan hiss etmə, ürəyə damma, duyma; **a ~ of disaster** fəlakəti qabaqcadan hiss etmə / duyma; *I had a premonition that my life was about to change Mən hiss edirdim ki, həyatım dəyişmək üzrədir*
**premonitory** [prıˈmɔnıtərı] *adj* xəbərverən, xəbərdar edən, xəbərdaredici, saqındırıcı; **~ signs** xəbərdaredici işarələr; **~ feelings** xəbərdaredici hisslər
**prenatal** [ˈpri:neıtl] *adj* doğuşdan əvvəlki /qabaqkı; doğumqabağı; **~ care** hamilə qadına doğumqabağı qayğı; hamiləliyin gigiyenası
**preoccupation** [pri.ɔkjuˈpeıʃn] *n* **1.** başqalarından əvvəl əmlaka sahib olma; başqasından əvvəl yer tutma; **2.** fikir, təlaş, iztirab, əndişə, təşviş; **3.** qayğı; qeyd; **my greatest ~** mənim ən böyük qayğım; *The nature of truth is one of the preoccupation of modern philosophy Həqiqətin təbiəti müasir fəlsəfənin əsas qayğılarından biridir*
**preoccupied** [priˈɔkjupaıd] *adj* fikrə qərq olmuş, çox məşğul; *I've been too preoccupied with my work to even think about taking a holiday Mən işimlə o qədər məşğulam ki, hətta istirahət haqqında belə fikirləşmirəm*
**preoccupy** [priˈɔkjupaı] *v (pt, pp* **-pied) 1.** başqalarından əvvəl / qabaq tutmaq; **2.** *(adət. məchulda)* məşğul olmaq, diqqəti cəlb/məşğul etmək, düşündürmək, iztiraba / əndişəyə salmaq; *The future of his son had preoccupied him greatly of late Son zamanlar oğlunun gələcəyi onu çox düşündürürdü / əndişəyə salırdı*
**prep**[1] [prep] *n d.d.* **1.** dərs hazırlama; **2.** hazırlıq məktəbi; **3.** ev tapşırığı
**prep**[2] [prep] *adj d.d.* hazırlıq; **~ school** hazırlıq məktəbi
**prepack** [ˌpri:ˈpæk] *v* malı tərəzidə çəkib bükmək / qablaşdırmaq
**prepacked** [ˌpri:ˈpækt] *adj* tərəzidə çəkilib bükülmüş *(mal haq.)*; **~ goods** tərəzidə çəkilib bükülmüş mal
**prepaid**[1] [ˌpri:ˈpeıd] *adj* əvvəlcədən / qabaqcadan ödənmiş / ödənən; franko edilmiş, yolxərci qabaqcadan ödənilmiş *(yük və ya poçt ilə göndərilən şeylər haq.)*
**prepaid**[2] [ˌpri:ˈpeıd] **prepay** *felinin pt və pp forması*
**preparation** [ˌprepəˈreıʃn] *n* **1.** hazırlama; hazırlanma, hazırlaşma; hazırlıq; **~ of drugs** dərmanların hazırlanması; **the ~ of meals** yeməklərin hazırlanması; **to make ~s for the journey** səyahətə hazırlıq görmək; *You can't pass an exam without preparation Hazırlıqsız imtahan vermək olmaz; The country is making preparations for war / to go to war Ölkə müharibəyə hazırlaşır / hazırlıq görür*; **2.** dərs hazırlama; **3.** dərman
**preparative**[1] [prıˈpærətıv] *n* = **preparation** *(1-ci mənada)*
**preparative**[2] [prıˈpærətıv] *adj* hazırlıq, hazırlıq görən
**preparatory** [prıˈpærətrı] *adj* hazırlıq; ilk, ilkin; **~ measures** hazırlıq tədbirləri; **~ stage** hazırlıq mərhələsi; **~ meeting** hazırlıq iclası; **~ investigation** ilkin istintaq; **a ~ course for students entering the university next year** gələn il universitetə daxil olmaq istəyən şagirdlər üçün hazırlıq kursu
**prepare** [prıˈpeəʳ] *v* **1.** hazırlaşmaq, hazırlamaq; **to ~ lessons** dərslərə hazırlaşmaq *(müəllim)*, dərsləri hazırlamaq *(şagird, tələbə)*; **to ~ a lecture** mühazirə hazırlamaq; **to ~ a scheme of action** hərəkət üçün plan hazırlamaq; **to ~ a pupil for an examination** şagirdi imtahana hazırlamaq/hazırlaşdırmaq; **to ~ *smb.* to receive bad news** bir kəsi pis xəbər üçün hazırlamaq; **2.** hazırlaşmaq; **to ~ for an examination/for battle** imtahana/döyüşə hazırlaşmaq; *The troops prepared (themselves) to go into battle Qoşunlar döyüşə girməyə hazırlaşdı*; **3.** təchiz etmək; silahlandırmaq; **to ~ an expedition** ekspedisiyanı təchiz etmək; **4.** hazırlamaq; **to ~ a medicine** dərman hazırlamaq; **to ~ a drink** içki hazırlamaq
**prepared** [prıˈpeəd] *adj* **1.** hazır, hazırlanmış; *I knew there were problems, but I was not prepared for this Mən bilirdim ki, orada problemlər var, amma mən buna hazır deyildim*; **2.** təmizlənmiş; **~ chalk** təmizlənmiş tabaşir
**preparedness** [prıˈpeədnıs] *n* hazırlıq, hazır olma; *Everything was in a state of preparedness Hər şey hazır vəziyyətdə idi; The troops are in a state of preparedness Qoşunlar hazır vəziyyətdədir / hazır vəziyyətə gətirilib*
**prepay** [ˈpri:ˈpeı] *v (pt, pp* **prepaid)** əvvəlcədən ödəmək *(yükün və ya poçt ilə göndərilən şeylərin yol və daşıma xərclərini)*
**prepayment** [ˈpri:ˈpeımənt] *n* **1.** əvvəlcədən ödəmə; **~ of charges** daşımanın xərcinin əvvəldən ödənilməsi; **2.** *pl tic.* sifarişçidən alınan avans / beh
**pre-plan** [prıˈplæn] *v* əvvəlcədən/ qabaqcadan planlaşdırmaq
**preponderance** [prıˈpɔndərəns] *n* üstünlük; **~ of force** *hərb.* qüvvənin üstünlüyü; *There is a preponderance of tigers in the forest Şirlərin meşədə üstünlüyü var*
**preponderant** [prıˈpɔndərənt] *adj* üstünlüyə malik olan, üstünlük təşkil edən; imtiyazlı; **~ influence** üstünlüyə malik olan təsir; *Yellow was preponderant colour in the room Otaqda sarı rəng üstünlük təşkil edirdi*
**preponderate** [prıˈpɔndəreıt] *v* **1.** üstünlüyə malik olmaq, üstünlük qazanmaq; *Neither side preponderates Tərəflərdən heç biri üstünlüyə malik deyil*; **to ~ in the voting** səsvermədə üstünlük qazanmaq/üstünlüyə malik olmaq; **2.** hakim/üstün olmaq
**preposition** [ˌprepəˈzıʃn] *n qram.* **1.** sözönü; **2.** prepozisiya *(cümlə üzvünün bilavasitə aid olduğu başqa üzvün qabağında tutduğu vəziyyət)*
**prepositional** [ˌprepəˈzıʃnl] *adj qram.* sözönlü; **~ object** sözönlü tamamlıq; **~ phrase** sözönlü ifadə/fraza
**prepossess** [ˌpri:pəˈzes] *v* **1.** *(adət. məchulda işlənir)* sahib olmaq, mənimsəmək, yiyələnmək, dərindən öyrənmək; çulğamaq, bürümək *(hiss, fikir və s.)*; *They were prepossessed with ill opinion of me Onlar mənim haqqımda pis fikirdə idilər*; **2.** təsir/meyl/rəğbət yaratmaq *(adət. müsbət)*; *The girl was prepossessed by the young man's appearance and manners Cavan oğlanın xarici görkəmi və davranışı qızda ona qarşı rəğbət yaratdı*
**prepossessing** [ˌpri:pəˈzesıŋ] *adj* cəzb edən /edici; cazibədar, hüsn-rəğbət oyadan; xoş; **~ manners** hüsn-rəğbət oyadan/xoş davranışlar; **~ face** cəzbedici/xoş sifət; *Her appearance is not very prepossessing Onun xarici görkəmi o qədər də cəzbedici/ xoşagələn/ cazibədar deyil*
**preposterous** [prıˈpɔstərəs] *adj* mənasız, cəfəng, boş; **~ idea** mənasız/cəfəng fikir; **~ claim** boş /cəfəng tələb; *The accusation/ suggestion is preposterous İttiham/Təklif mənasızdır*
**preposterously** [prıˈpɔstərəslı] *adv* cəfəng, cəfəng-cəfəng, boş, boş-boş, mənasız, mənasız-mənasız
**prerogative**[1] [prıˈrɔgətıv] *n* müstəsna hüquq/ixtiyar, imtiyaz, üstünlük; səlahiyyət; *A President has the prerogative of pardoning criminals Prezidentin cinayətkarları əfv etmək üçün müstəsna səlahiyyəti var*
**prerogative**[2] [prıˈrɔgətıv] *adj* müstəsna hüquqa/səlahiyyətə/üstünlüyə malik olan; müstəsna; **~ right** müstəsna hüquq
**presage**[1] [ˈpresıdʒ] *n* **1.** əlamət, nişanə; **a ~ of coming disaster** gəlməkdə/yaxınlaşmaqda olan fəlakətin əlaməti; **2.** ürəyə damma *(pis şey haq)*, duyma, qabaqcadan hiss etmə *(bəd xəbəri və s.)*
**presage**[2] [prıˈseıdʒ] *v* **1.** qabaqcadan xəbər vermək/ bildirmək, gələcəkdən xəbər vermək; *The dark clouds presaged a storm Qara buludlar tufan olacağından xəbər verirdi*; **2.** əvvəlcədən/qabaqcadan hiss etmək *(pis şeyi)*; *I presage that everything will end badly Mən əvvəlcədən hiss edirəm ki, hər şey pis qurtaracaq*
**presageful** [prıˈseıdʒfl] *adj* **1.** əvvəlcədən xəbər verən; uğursuz, nəhs, məşum; qorxulu, hədələyici, təhlükəli; **~ signs** nəhs/qorxulu əlamətlər; **2.** qabaqcadan /əvvəlcədən hiss edən; **~ of good/of evil** əvvəlcədən xeyiri/şəri hiss edən
**preschool** [ˌpri:ˈsku:l] *adj* məktəbəqədər; **~ education** məktəbəqədər təhsil
**prescience** [ˈpresıəns] *n* qabağı/ gələcəyi görmə
**prescient** [ˈpresıənt] *adj* qabağı/gələcəyi görmə qabiliyyəti olan; **~ of the future** gələcəyi görən/görə bilən
**prescribe** [prısˈkraıb] *v* **1.** yazmaq *(dərman və s.)*; **to ~ a medicine** dərman yazmaq; *The doctor*

*prescribed some pills to help me to sleep Həkim mənə yatmağıma kömək etmək üçün bir neçə həb yazdı*; 2. təyin etmək; **to ~ regular hours of study** məşğələlər üçün müəyyən saatlar müəyyən etmək, məşğələlərin saatlarını müəyyənləşdirmək; 3. göstərmək, əmr vermək; *Don't prescribe to me what I am to do Nə etməli olduğumu mənə göstərmə/göstərməyin*

**prescription** [prɪs'krɪpʃn] *n* 1. göstəriş, əmr, sərəncam; 2. *tib.* resept; dərman yazma; **to make up a ~** reseptə əsasən dərman hazırlamaq; *The drug is available only on prescription Dərman ancaq reseptlə verilir, Dərmanı ancaq reseptlə əldə etmək olar*

**prescriptive** [prɪs'krɪptɪv] *adj* 1. direktiv; **~ documents** direktiv sənədlər; 2. *dilç.* praktik; **a ~ grammar** praktik qrammatika

**presence** ['prezns] *n* 1. olma, hazır olma, iştirak, iştirak etmə; mövcud olma; **the ~ of strangers** kənar adamların olması/ iştirakı; **in the ~ of *smb.*** bir kəsin iştirakı ilə; *Your presence is required Sənin/ Sizin iştirakın/ iştirakınız tələb olunur*; 2. duruş, qamət, vüqar, görkəm, boy-buxun; xarici görünüş/ görkəm; **a young man of handsome ~** boy-buxunlu gənc oğlan; *He has no presence Xaricən o, zəhmli deyil*

**present**[1] ['preznt] *n* I 1. indiki/hazırkı zaman; **at ~** indiki zamanda, hazırda, indi; **for the ~** hələlik, indiki vaxta kimi /qədər; 2. **(the ~)** *qram.* indiki zaman

**present** ['preznt] *n* II hədiyyə; **birthday ~s** doğum günü münasibətilə hədiyyələr; **to make a ~ of *smth.* to *smb.*** bir kəsə bir şey hədiyyə etmək; **to give a ~ of *smth.* to *smb.*** bir kəsə bir şeyi hədiyyə vermək

**present**[2] ['preznt] *adj* 1. iştirak edən, olan; **to be ~ at a meeting/at a lecture** iclasda/ mühazirədə iştirak etmək; *Were you present when the news was announced? Xəbər elan edildə sən/siz orada idinmi? /idinizmi?; All the present welcomed the decision İştirak edənlərin hamısı qərarı alqışladı; There were 200 people present at the meeting İclasda 200 adam iştirak edirdi*; 2. mövcud, mövcud olan; **~ price** mövcud qiymət; *The threat of war is still present Müharibə təhlükəsi hələ də mövcuddur*; 3. bu, həmin, hazırkı; **the ~ book** bu/həmin kitab; **the ~ writer** bu sətirləri yazan; 4. *qram.* indiki; **~ tense** indiki zaman; **~ participle** indiki zaman feli sifəti

**present**[3] [prɪ'zent] *v* 1. bağışlamaq, vermək, təqdim etmək, hədiyyə vermək/etmək; **to ~ *smb.* with a gold watch** bir kəsə qızıl saat bağışlamaq/hədiyyə etmək; **to ~ the prizes** prizləri təqdim etmək; *He presented the actress with a bunch of flowers O, aktrisaya bir dəstə gül verdi/təqdim etdi; Allow me to present Mr. Brown İcazə verin cənab Braunu təqdim edim*; 2. göndərmək; **to ~ best regards** atəşin salam göndərmək; **to ~ oneself** gəlmək; **to ~ oneself for an examination/for trial** imtahana/ məhkəməyə gəlmək; 3. açıb göstərmək, aşkara çıxarmaq; *The question presents great difficulties Məsələnin həlli böyük çətinliklərlə bağlıdır*; 4. *teatr.* göstərmək, oynamaq *(tamaşanı)*

**presentable** [prɪ'zentəbl] *adj* ləyaqətli, layiqli, münasib, əlverişli; görkəmli, boy-buxunlu; vüqarlı; **~ clothes** layiqli paltar/ geyim; **~ gift** layiqli/münasib hədiyyə; *I've got several suits but not one of them is presentable Mənim bir neçə kostyumum var, lakin onlardan heç biri layiqli/ortaya çıxası deyil*; **to make oneself ~** özünü abıra salmaq, üst-başını qaydaya salmaq; *I must go and make myself presentable before the guests arrive Qonaqlar gəlməmiş/gəlməzdən qabaq mən gedib üst-başımı/özümü qaydaya salmalıyam*

**presentation** [ˌprezn'teɪʃn] *n* 1. təqdim etmə/ edilmə; vermə, verilmə; **to make a ~** hədiyyə vermək/təqdim etmək; *The watch was a presentation to me Bu saatı mənə hədiyyə veriblər*; 2. göstərmə *(tamaşa haq.)*; 3. anlayış, məlumat; 4. *kils.* dini vəzifə üçün namizəd göstərmə

**present-day** ['prezntdeɪ] *adj* müasir; cari; **~ languages** müasir dillər; **~ events** cari hadisələr

**presenter** [prɪ'zentə'] *n* 1. təqdim edən, verən *(ərizə, məktub və s.)*; 2. hədiyyə/bəxşiş verən *(adam)*

**presently** ['prezntlɪ] *adv* 1. tezliklə, tezlikcə, dərhal, çox keçmədən, tez bir zamanda; *I'm coming presently Mən bu saat gəlirəm; I'll be with you presently Mən tezliklə səninlə/sizinlə olacam*; 2. indi, hazırda; *The book is presently unavailable Bu kitab indi tapılmır, Bu kitabı indi tapmaq olmur*

**preservation** [ˌprezə'veɪʃn] *n* 1. saxlama, mühafizə, mühafizə etmə, qoruma, qorunma; **~ of health** səhhəti qoruma; **~ of ancient building** qədim binaları/ tikililəri qoruma; 2. olduğu kimi qalma, yaxşı saxlanma; bütövlük; **an ancient manuscript in good ~** yaxşı vəziyyətdə saxlanılmış qədim əlyazma; 3. konservləşdirmə, konserv hazırlama

**preservative** [prɪ'zɜːvətɪv] *n tib.* prezervativ *(qoruyucu dərman/vasitə)*

**preserve**[1] [prɪ'zɜːv] *n* 1. *adət. pl* mürəbbə; konserv; 2. quş və ya balıq qoruğu; 3. *pl* gözlük *(gözü işıqdan, tozdan, küləkdən qorumaq üçün)*

**preserve**[2] [prɪ'zɜːv] *v* 1. qorumaq, hifz etmək; **to ~ peace** sülhü qorumaq; *I pray that fate may preserve you from all harm Mən dua edirəm ki, tale səni/sizi bütün bəlalardan hifz etsin*; 2. saxlamaq, qoruyub saxlamaq; **to ~ silence** susmaq, dinməmək, danışmamaq; **to ~ old customs** qədim/köhnə ənənələri qoruyub saxlamaq; **to ~ family traditions** ailə adətlərini qoruyub saxlamaq; 3. saxlamaq *(meyvəni, tərəvəzi və s.)*; 4. mürəbbə bişirmək/hazırlamaq; konserv etmək/ hazırlamaq; 5. qorumaq *(brakonyerlərdən)*



**preserver** [prɪ'zɜːvə'] *n* 1. saxlayan, qoruyan, mühafizə edən; xilaskar; 2. ovçuluq qoruğunda gözətçi; 3. konserv və s. hazırlayan; 4. *pl* qoruyucu gözlük

**pre-set** [priː'set] *adj* əvvəlcədən quraşdırılmış; *The video was pre-set to record the match Yarışı yazmaq üçün video əvvəlcədən quraşdırılmışdı*

**preside** [prɪ'zaɪd] *v* 1. sədrlik etmək, sədr olmaq; **to ~ at/over a meeting** iclasda sədrlik etmək; 2. rəhbərlik/nəzarət etmək

**presidency** ['prezɪdənsɪ] *n* 1. prezidentlik; **talks begun during Reagan's ~** Reyqanın prezidentliyi dövründə başlanmış danışıqlar; 2. sədrlik

**president** ['prezɪdənt] *n* 1. prezident; **the President of the United States** Birləşmiş Ştatların Prezidenti; **President Clinton/ Bush** Prezident Klinton/Buş; 2. müəyyən bir təşkilatın rəhbəri/başçısı; **~ of the club** klubun prezidenti; 3. sədr; **honorary ~** fəxri sədr; **President of the Senate** *amer.* Senatın sədri; **~ of the jury** jürinin sədri

**presidential** [ˌprezɪ'denʃl] *adj* prezident; **~ election** prezident seçkisi; **~ decision** prezident qərarı; **~ candidate** prezidentliyə namizəd

**presidium** [prɪ'sɪdɪəm] *n* rəyasət heyəti; **the ~ of the ruling party** iqtidarda olan partiyanın rəyasət heyəti

**press**[1] [pres] *n* I 1. basma, sıxma; **to give *smth.* a slight ~** bir şeyi yüngülcə sıxmaq; 2. *id.* sıxma gücü; **one-hand/two-hand ~** birəllə/ ikiəllə sıxma; 3. press; **wine ~** üzüm pressi *(sıxmaq üçün)*; **coining ~** sikkə və s. zərb etmək üçün press; 4. basabas, basırıq; yığın, topa; tünlük; dəstə, izdiham, camaat; *The child was lost in the press Uşaq izdihamın içində itdi*; 5. qaçqov, tələsmə, qaçaqaç

**press** [pres] *n* II 1. mətbuat; **periodical ~** dövri mətbuat; **daily ~** gündəlik qəzet; **freedom/ liberty of the ~** mətbuat azadlığı; **to have/to get a good ~** mətbuatda yaxşı rəy almaq; 2. çap, çap olunma; *The book is ready to go to press Kitab çap olunmağa/çapa getməyə hazırdır*; **to be in the ~** çapda olmaq; **to be off the ~** çapdan çıxmaq; **to pass a proof for ~** çapa yazmaq; 3. tipoqrafiya; nəşriyyat; **Oxford University Press** Oksford Universitetinin nəşriyyatı; 4. çap dəzgahı

**press** [pres] *n* III rəfli şkaf *(adət. divarda)*

**press**[2] [pres] *adj* mətbuat; **~ agency** mətbuat agentliyi; **~ conference** mətbuat konfransı

**press**[3] [pres] *v* 1. basmaq, sıxmaq; **to ~ the button** düyməni basmaq *(zəngdə və s.)*; **to ~ *smb.'s* hand** bir kəsin əlini sıxmaq; *My shoes presses my toes Çəkməm barmaqlarımı sıxır*; **to ~ *smb.* to *one's* breast** bir kəsi döşünə/sinəsinə sıxmaq; 2. əzmək, sıxmaq; **to ~ grapes** üzüm sıxmaq/əzmək; 3. basmaq, vurmaq *(möhür, ştamp)*; **to ~ a stamp on a document** sənədə ştamp vurmaq/ basmaq; 4. ütüləmək; 5. sıxışdırmaq, təzyiq göstərmək; **to ~ the enemy hard** düşməni bərk sıxışdırmaq; 6. *(adət. məchulda)* sıxışdırmaq, sıxıntı vermək, təzyiq etmək; çətinləşdirmək, çətin vəziyyətə salmaq; **to be hard ~ed** çətinlikdə olmaq, çətinliyə /çətin vəziyyətə düşmək; **to be ~ed for money** puldan çətinlik çəkmək; 7. təkid/məcbur /israr etmək; **to ~ *one's* claims** tələbində israrlı olmaq; *The judge pressed the witness to answer the question Hakim şahidi məcbur etdi ki, suala cavab versin*; 8. təkidlə tələb etmək; **to ~ for an international treaty** beynəlxalq sazişin əldə edilməsini təkidlə tələb etmək; **to ~ for rent** ev kirayəsinin verilməsini təkidlə tələb etmək; 9. **(on, upon)** zorla qəbul etdirmək/ boynuna qoymaq; **to ~ *one's* opinion on *smb.*** öz fikrini zorla bir kəsə qəbul etdirmək; 10. **(on, upon)** narahat etmək, məyus/dilxor etmək; təzyiq göstərmək, əziyyət vermək, əzmək, incitmək, sıxıntı vermək; *The new tax presses heavily on the people Yeni vergi xalqa çox sıxıntı verir*; **to ~ ahead** irəli hərəkət etmək, irəli getmək; **to ~ ahead with a plan** planını cidd-cəhdlə yerinə yetirmək; **to ~ back** geriyə atmaq; **to ~ down** basmaq, basıb/sıxıb əzmək; **to ~ the pedal down** pedalı basmaq *(maşında)*; **to ~ forward** yönəltmək, üz qoymaq, cummaq, hücum etmək, yerimək *(sürətlə)*, itələyə-itələyə irəli getmək; *They pressed forward to see what was happening Nə baş verdiyini görmək üçün onlar irəli yeridilər*; **to ~ on** tələsmək, cidd-cəhdlə davam etdirmək *(işi, səyahəti və s.)*; **to ~ out** 1) sıxmaq, sıxıb çıxartmaq; **to ~ out the juice** sıxıb şirəsini çıxartmaq; 2) ütüləmək *(paltarı)*; **to ~ up** 1) sıxışdırmaq, sıxmaq; dara salmaq; **to be ~ed up (together)** bir-birinə sığınmaq; 2) toplaşmaq, yığışmaq

**pressed** [prest] *adj* 1. sıxılmış; **~ fuel** kömür briketi *(kərpic şəklində preslənmiş kömür, torf və s.)*; **~ beef** ət konservi; 2. sıxıntı içərisində olan; *I'm very pressed – Can I call you back later? Mənim vaxtım çox azdır – Olarmı, sənə/sizə sonra zəng edim?*

**pressing**[1] ['presɪŋ] *n* 1. sıxma, sıxılma, presləmə; preslənmə; 2. preslənmiş məmulat/məhsul/şey; 3. *tex.* ştamplama, ştamplanma

**pressing**[2] ['presɪŋ] *adj* 1. təxirəsalınmaz, yubadılmaz, tələsik, təcili; **~ payments** təxirəsalınmaz/təcili ödəmə; **~ order** təcili sifariş; **~ problems/questions** təxirəsalınmaz problemlər / məsələlər; *He left the meeting early, saying he had a pressing engagement O, təxirəsalınmaz görüşü olduğunu deyərək, iclası vaxtından əvvəl tərk etdi*; 2. inadlı, təkidli, israrlı, səbatlı; **~ invitation** təkidli dəvət; *Since you are so pressing... Bir halda ki, sən /siz belə israr edirsən/ edirsiniz...*

**pressman** ['presmən] *n (pl* **-men** [-men]) 1. jurna-

list; reportyor; 2. çapçı; 3. presləyici, press dəzgahında işləyən fəhlə
**press-review** ['presrı'vju:] *n* mətbuat xülasəsi
**press-room** ['presrum] *n* **1.** jurnalistlər otağı, mətbuat mərkəzi; 2. çap sexi; 3. presləmə sexi; ştamplama sexi
**pressure** ['preʃəʳ] *n* **1.** təzyiq, təzyiq etmə, sıxışdırma, təzyiq göstərmə; **to put ~ upon** ***smb.*** bir kəsə təzyiq göstərmək/ etmək; **under the ~ of world public opinion** dünyanın ictimai fikrinin təzyiqi altında; **high ~** yüksək təzyiq; *He says that he made his statement to the police under high pressure, and that the statement is false O deyir ki, o, ifadəni polisə yüksək təzyiq altında verdi və onun ifadəsi yalandır*; 2. çətin vəziyyət, çətinlik; **financial ~** maliyyə çətinliyi; **~ for money** pul çatışmazlığı/ çətinliyi; 3. zülm, sıxıntı, əziyyət, əzab, cəfa; **the ~ of poverty** yoxsulluğun əzabı/ sıxıntısı/ cəfası; **the ~ of taxation** vergi sıxıntısı; 4. *tib.* təzyiq; **blood ~** qan təzyiqi; 5. *el.* gərginlik; **high ~** yüksək gərginlik;
◊ **to work at high ~** ciddiyyətlə /qızğın surətdə/var gücü ilə işləmək; **to work at low ~** həvəssiz/ürəksiz işləmək
**pressurization, -sation** [.preʃəraı'zeıʃn] *n* **1.** *tex.* germetizasiya, kip bağlama; 2. təzyiqlə doldurma *(hava, qaz)*
**pressurize, -ise** ['preʃəraız] *v* **1.** *tex.* germetikləşdirmək, kip bağlamaq; 2. *məc.* təzyiq göstərmək, sıxışdırmaq
**prestige** [pres'ti:ʒ] *n* nüfuz, hörmət, etibar; **to lose** ***one's*** **~** nüfuzunu/hörmətini/ etibarını itirmək; **to win ~** hörmət/ etibar/ nüfuz qazanmaq; **social ~** ictimai nüfuz/ etibar/ hörmət; *He suffered a loss of prestige when the book didn't sell Kitab satılmayanda o, nüfuzunu itirdi*
**presumable** [prı'zju:məbl] *adj* mümkün, mümkün olan, ola bilən; ağlabatan, ehtimal edilən; **~ success** mümkün uğur/ müvəffəqiyyət; **~ failure** mümkün uğursuzluq/ müvəffəqiyyətsizlik
**presumably** [prı'zju:məblı] *adv* yəqin, yəqin ki, ehtimal, ehtimal ki, olsun ki, güman ki; *Presumably the plane is late because of the fog Yəqin ki/Güman ki, təyyarə dumana görə gecikib*
**presume** [prı'zju:m] *v* **1.** güman/ zənn/ fərz/ hesab/ ehtimal/ təxmin etmək; sanmaq; *John did not say when he would return, but I presume he'll be back for dinner Con nə vaxt qayıdacağını demədi, lakin mən güman edirəm ki, o, nahar etmək üçün qayıdacaq; From the way they talked I presumed them to be married Onların danışığından mən belə zənn etdim ki, onlar evləniblər; I presume from your speech that you are a foreigner Danışığından/ Danışığınızdan güman etmək olar ki, sən/siz əcnəbisən /əcnəbisiniz*; 2. cəsarət/cürət/ürək etmək; *I wouldn't presume to argue with you Mən səninlə/sizinlə mübahisə etməyə cəsarət etmərəm*
**presumed** [prı'zju:md] *adj* təxmin/ güman/ ehtimal/ fərz edilən, nəzərdə tutulan; **~ author** təxmin/güman edilən müəllif
**presumedly** [prı'zju:mıdlı] *adv* təxmini olaraq, təqribi, təqribən; təxminə/ ehtimala görə
**presumption** [prı'zʌmpʃn] *n* **1.** fərziyyə, güman, təxmin, fərz, ehtimal; **the ~ of guilt** günahkar olma haqqında güman/ ehtimal; *This article is based on too many false presumptions Bu məqalə bir sıra səhv fərziyyələrə /ehtimallara əsaslanır; This is a mere presumption Bu sadəcə olaraq fərziyyədir/gümandır*; 2. *hüq.* prezumpsiya *(sübut edilməyincə doğru sayılmayan ittiham)*; 3. özünə güvənmə/ qürrələnmə, lovğalıq, saymazlıq, təkəbbür, iddialılıq
**presumptive** [prı'zʌmptıv] *adj* təxmin/ güman/ ehtimal/ fərz edilən; **~ diagnosis** təxmin/ ehtimal edilən diaqnoz
**presumptuous** [prı'zʌmptʃuəs] *adj* özünə güvənən/ qürrələnən, çox iddialı/lovğa/ təkəbbürlü, heç kəsi bəyənməyən, başqalarına xor baxan
**presuppose** [.pri:sə'pouz] *v* əvvəlcədən güman/ ehtimal/ fərz etmək; *I presuppose that you know the principal facts of the case Mən güman edirəm ki, sən/siz bu iş haqqında əsas/ prinsipial faktları bilirsən/ bilirsiniz*
**presupposition** [.pri:sʌpə'zıʃn] *n* fərziyyə; güman, təxmin, ehtimal, təsəvvür; güman/ fərz/ ehtimal etmə
**pretence** [prı'tens] *n* **1.** hiyləgərlik, riyakarlıq, ikiüzlülük, yalançılıq; yalan, hiylə, kələk; *His illness was all a pretence Onun xəstəliyi bütünlüklə yalan /kələk idi*; **under/on false ~s** yalançılıqla, hiyləgərliklə; 2. bəhanə; **under the ~ of helping** kömək etmək bəhanəsilə; *That's only a pretence Bu ancaq bəhanədir*; 3. iddia, tələb; 4. iddialılıq, lovğalıq, təşəxxüs
**pretend** [prı'tend] *v* **1.** hiyləgərlik / riyakarlıq etmək; yalandan özünü... göstərmək/ oxşatmaq/ qoymaq; ...kimi qələmə vermək, özünü ... vurmaq; **to ~ that one is asleep, to ~ to be asleep** özünü yatmış kimi göstərmək; *He pretends to be very busy O, özünü elə göstərir ki, guya çox məşğuldur*; 2. oynamaq *(uşaq oyunu haq.)*; hesab etmək; *Let's pretend to be robbers Gəlin, qaçaq-qaçaq oynayaq; Let's pretend we're father and mother Gəlin, belə hesab edək ki, biz ata və anayıq*; 3. bəhanə kimi istifadə etmək; **to ~ illness as a reason for** ***one's*** **absence** iştirak etmədiyinə görə xəstəliyi bəhanə gətirmək; 4. **(to)** iddia/tələb etmək, istəmək; ...iddiasında olmaq; **to ~ to a right / to a title / to the throne** hüquq/ titul/taxt-tac iddiasında olmaq; **to ~ to great learning** böyük alimlik iddiasında olmaq; 5. cürət/cəsarət etmək; *I won't pretend to tell you how this machine works, because you understand it much better than I Mən bu maşının necə işlədiyini sənə/sizə de-*



*məyə cəsarət etmirəm, çünki sən/siz onu məndən daha yaxşı bilirsən/bilirsiniz*
**pretended** [prı'tendıd] *adj* uydurma, əsli olmayan, saxta; **~ friend** uydurma dost; **~ loyalty** yalançı sədaqət
**pretender** [prı'tendəʳ] *n* **1.** hiyləgər, riyakar, ikiüzlü/özünü tülkülüyə qoyan *(adam)*; 2. iddiaçı, iddia/tələb edən, istəyən *(adam)*
**pretension** [prı'tenʃn] *n* iddia, tələb; tələb/ iddia etmə; ...iddisasında olma; **to have artistic ~s** rəssamlıq iddiasında olmaq; **a man of no ~(s)** heç bir iddiası olmayan adam
**pretentious** [prı'tenʃəs] *adj* iddialı, təşəxxüslü, lovğa; **a ~ person** iddialı/ lovğa adam; **a ~ style** iddialı üslub; **~ manner** iddialı/lovğa xasiyyət
**pretentiousness** [prı'tenʃəsnıs] *n* iddialılıq, lovğalıq; təşəxxüs, təkəbbür
**preterhuman** [.pri:tə'hju:mən] *adj* fövqəladə, insan qüvvəsindən xaric, fövqəlbəşər
**preternatural** [.pri:tə'nætʃrəl] *adj* fövqəltəbii, qeyri-təbii, xariqüladə, qeyri-adi; misilsiz, misli görünməmiş; **~ power** fövqəltəbii/ xariqüladə hakimiyyət; **~ ability** xariqüladə/ misilsiz qabiliyyət; **a fighter of ~ strength** qeyri-təbii/qeyri-adi gücə malik pəhləvan; **~ force** fövqəltəbii/ xariqüladə qüvvə; *In former times people believed that thunder and lightning were signs of preternatural forces Keçmiş zamanlarda insanlar inanırdılar ki, ildırım və şimşək fövqəltəbii qüvvələrin əlamətləridir*
**preternaturally** [.pri:tə'nætʃrəlı] *adv* fövqəltəbii/ xariqüladə/ görünməmiş bir tərzdə
**pretext¹** ['pri:tekst] *n* bəhanə; **on some ~ or other** bu və ya digər bəhanə ilə; **to find a ~ for delay/delaying** yubatmaq/təxirə salmaq üçün bəhanə tapmaq; *He came to the house under/on the pretext of seeing Mr Smith, but he really wanted to see his daughter O, evə cənab Smiti görmək bəhanəsilə gəldi, əslində isə o onun qızını görmək istəyirdi*
**pretext²** [prı'tekst] *v* bəhanə tapmaq/ gətirmək, bəhanə etmək, boyun qaçırmaq
**prettify** ['prıtıfaı] *v (pt, pp* **-fied)** *d.d.* bəzəmək, bəzək /zinət vermək, zinətləndirmək, qəşəngləşdirmək
**prettily** ['prıtılı] *adv* gözəl, qəşəng, gözəlcə, qəşəngcə; **to dress ~** gözəl/ qəşəng geyinmək; **to behave ~** gözəlcə /qəşəngcə davranmaq
**prettiness** ['prıtınıs] *n* gözəllik, qəşənglik; qanışirinlik, gözəşirinlik; cazibədarlıq, füsunkarlıq
**pretty¹** ['prıtı] *adj* **(-ier; -iest)** qəşəng, sevimli, yaxşı; qanışirin, xoşsifət; gözəl, füsunkar; cəzbedici; zərif; **a ~ girl** qəşəng/ cəzbedici qız; **a ~ face** qəşəng/ cəzbedici sifət; **a ~ village** gözəl/ qəşəng kənd; **a ~ boy** zərif oğlan; *What a pretty dress! Nə qəşəng paltardır!*; **(as) ~ as a picture** şəkil kimi gözəl; **a ~ voice** zərif /füsunkar səs; **a ~ song** ahəngdar/ gözəl mahnı
**pretty²** ['prıtı] *adv d.d.* xeyli, olduqca, çox, dedikcə, dedikcə çox; **to feel ~ well** özünü xeyli yaxşı hiss etmək; *He did it pretty well O, bunu dedikcə/olduqca yaxşı etdi; They do it pretty badly Onlar bunu çox/olduqca pis edirlər; The two boys are pretty much alike Bu iki oğlan bir-birinə çox oxşayır*
**prettyish** ['prıtııʃ] *adj d.d.* olduqca/dedikcə qəşəng
**prettyism** ['prıtıızm] *n* zahiri qəşənglik/ zəriflik; cazibədarlıq, füsunkarlıq, qanışirinlik
**pretty-pretties** ['prıtı.prıtız] *n* bəzək-düzək, bəzək-düzək şeyləri; *She was wearing all her pretty-pretties O, bütün bəzək-düzək şeylərini geyinmişdi/ taxmışdı*
**pretzel** ['pretsl] *n amer.* krendel *(bulka növü)*
**prevail** [prı'veıl] *v* **1.** qalib/üstün gəlmək; qələbə çalmaq; *We hope that truth will prevail Biz ümid edirik ki, həqiqət qalib gələcək; Justice has prevailed; the guilty man has been punished Ədalət qələbə çalıb; günahkar adam cəzalandırılıb*; 2. üstün olmaq, üstünlük təşkil etmək; hakim/yüksək olmaq; *The north wind prevails in those parts of the country Ölkənin bu yerlərində şimal küləyi üstünlük təşkil edir/hakimdir*; 3. **(among, in)** mövcud olmaq, geniş yayılmaq; *A belief in magic still prevails among some tribes Caduya inam hələ də bəzi qəbilələr arasında geniş yayılıb*; **to ~ upon/on** dilə tutmaq, yola gətirmək, inandırmaq; *I prevailed on/upon him to accept the invitation Mən onu dəvəti qəbul etməyə inandırdım*
**prevailing** [prı'veılıŋ] *adj* üstünlük təşkil edən; hakim olan/kəsilən, üstün olan, əsas; ən çox yayılmış; **~ winds** üstünlük təşkil edən küləklər *(yəni ən çox əsən)*; *The prevailing wind here is from the north Burada külək əsasən şimaldan əsir*; **the ~ customs** əsas ənənələr; **the ~ fashions** əsas modalar/dəblər
**prevalence** ['prevələns] *n* **1.** yayma, yayılma; intişar, intişar tapma; 2. yayılma /intişar tapma dərəcəsi; 3. üstünlük təşkil etmə, hakim olma
**prevalency** ['prevələnsı] *n* = **prevalence**
**prevalent** ['prevələnt] *adj* **1.** geniş yayılmış, intişar tapmış; tez-tez təsadüf edilən/rast gəlinən; **~ custom** geniş yayılmış ənənə; *Eye diseases are prevalent in some tropic countries Bəzi tropik ölkələrdə göz xəstəliyi geniş yayılıb*; **diseases ~ in the world** dünyada intişar tapmış /yayılmış xəstəliklər; *The cholera was prevalent in those years O illərdə vəba geniş yayılmışdı*; 2. üstünlük təşkil edən, tez-tez təsadüf edilən, hakim olan
**prevaricate** [prı'værıkeıt] *v* **1.** boyun qaçırmaq; birbaşa cavabdan boyun qaçırmaq; yalan demək, vicdansızlıq etmək; *Instead of admitting his guilt, he prevaricated O, günahını etiraf etmək əvəzinə biclik işlətdi və çətin vəziyyətdən çıxdı*; 2. *amer.* yalan danışmaq/demək

**prevarication** [prɪ,værɪ'keɪʃn] *n* boyun qaçırma, canını qurtarma, birbaşa cavabdan boyun qaçırma

**prevent** [prɪ'vent] *v* **1.** qabağını/ qarşısını almaq; **to ~ a disaster** fəlakətin qarşısını/ qabağını almaq; **to ~ the spread of disease** xəstəliyin yayılmasının qarşısını almaq; **2.** mane olmaq, imkan verməmək; **to ~ war** müharibəyə imkan verməmək; *My cold prevents me from going out Mənim soyuqlamam mənə çölə/bayıra çıxmağa imkan vermir*

**prevention** [prɪ'venʃn] *n* qarşısını/qabağını alma, mane olma, xəbərdar etmə; **~ of crime** cinayətin qarşısını/ qabağını alma

**preventive** [prɪ'ventɪv] *adj* **1.** qarşısını/qabağını alan, qoruyucu; ehtiyat; **~ measures 1)** ehtiyat tədbirləri; **2)** *tib.* profilaktika *(xəstəliyin qarşısını alma tədbirləri)*; **3)** *tex.* profilaktik təmir; **2.** preventiv *(bir şeyin qabağını alan)*; **~ war** qabaqlayıcı müharibə *(müharibəyə hazırlaşan düşmənin hücumunun qarşısını almaq məqsədi daşıyan)*

**preview** ['pri:vju:] *n* **1.** kinofilmə, sərgiyə və s. ilk baxış; **2.** anons, bildiriş, elan *(teatr tamaşaları, kinofilmlər və s. haqqında qabaqcadan verilən elan)*

**previous** ['pri:vɪəs] *adj* **1.** qabaqkı, bundan əvvəlki/ qabaqkı; keçən; **on the ~ page** bundan əvvəlki səhifədə; **his ~ experience** onun qabaqkı təcrübəsi; *He was here the previous day O, keçən gün burada idi; She had no previous experience of publishing Kitab çap etdirməkdə əvvəl onun heç bir təcrübəsi yox idi, Əvvəllər o heç bir kitab çap etdirməmişdi*; **2.** *d.d.* vaxtından əvvəl/ qabaq, tez, vaxtsız; *The statement is a little too previous Bəyanat bir az vaxtsızdır*

**previously** ['pri:vjəslɪ] *adv* qabaqcadan, əvvəlcədən, əvvəlcə, qabaqca, irəlidən; qabaqlar, keçmişdə, əvvəllər; *You had to inform me previously Sən/Siz gərək məni əvvəlcədən xəbərdar edəydin/edəydiniz; She had previously worked in television O, əvvəllər/ qabaqlar televiziyada işləyib; I haven't seen her previously Mən onu əvvəllər görməmişəm*

**prewar** [,pri:'wɔ:] *adj* müharibədən *(xüs. II Dünya müharibəsindən)* əvvəlki/qabaqkı; **~ cars** müharibədən əvvəlki/qabaqkı maşınlar; **in the ~ period** müharibədən əvvəlki/ qabaqkı dövrdə; *Industrial production has only just reached prewar levels Sənaye istehsalı müharibədən əvvəlki səviyyələrə ancaq indi çatıb*

**prey**[1] [preɪ] *n* qurban; qurbanlıq; yemə, yem olma; **to be/to become a ~ to** ***smth.*** bir şeyin qurbanı olmaq; **to fall a ~ to** ***smth.*** bir şeyə qurban getmək; *The zebra fell prey to the lion Zebr şirin qurbanı oldu; Mice and other small creatures are the owl's prey Siçanlar və digər balaca /xırda varlıqlar bayquşlar üçün qurbanlıqdır/ yemdir*; **birds of ~** yırtıcı quşlar

**prey**[2] [preɪ] *v* **(on, upon) 1.** ovlamaq, tutmaq; *Cats prey on/upon mice Pişiklər siçanları tuturlar*; **2.** soymaq, qarət etmək, talamaq, çalıb-çapmaq; *The village was preyed upon Kənd qarət edildi*; **3.** başqasının hesabına yaşamaq; *He lives by preying on his relations O, qohumların hesabına yaşayır*; **4.** aldatmaq; **to ~ upon the credulous** sadəlövh adamları aldatmaq; **5.** əzab vermək, üzmək, iztirab vermək; *Remorse preyed upon his mind Vicdan əzabı onu üzürdü*

**price**[1] [praɪs] *n* **1.** qiymət; dəyər; **cash ~** nağd pulla qiymət; **cost ~** maya dəyəri; **agreed ~** razılaşdırılmış qiymət; **ceiling ~** ən yüksək qiymət; **buying/ purchase ~** alış qiyməti; **retail/wholesale ~** pərakəndə satış/ topdansatış qiyməti; *Prices have advanced/receded Qiymətlər artıb/düşüb; Prices are rising/ going up Qiymətlər qalxır; Prices are falling/ going down Qiymətlər aşağı düşür; He sold his house at/for a good price O, evini yaxşı qiymətə satdı*; **2.** mükafat, bəxşiş *(bir kəsin başı üçün)*; **3.** dəyər, qiymət; **above/ beyond/ without ~** qiymətsiz *(yəni çox dəyərli)*; **4.** qiymət; bahasına; *Such losses were too high a price to pay for victory Qələbə çox baha başa gəldi; It must be done at any price Bu nəyin bahasına olur-olsun edilməlidir*;

◊ **at a ~** baha qiymətə; *Fresh strawberries are now available – at a price! Təzə çiyələk indi var, — baha qiymətə! Not at any price Qətiyyən, Əsla, Heç bir halda*

**price**[2] [praɪs] *v* **1.** qiymət qoymaq, qiymətləndirmək; **to ~** ***smth.*** bir şeyə qiymət qoymaq, bir şeyi qiymətləndirmək; *The goods are priced too high Mallar çox yüksək qiymətləndirilib*; **2.** qiymətini göstərmək *(şeylərin, malların)*

**price-current** ['praɪs,kʌrənt] *n* preyskurant *(malların qiymət siyahısı)*

**price-cutting** ['praɪs,kʌtɪŋ] *n* qiymətlərin aşağı salınması

**priced** [praɪst] *adj* qiymətli, qiyməti göstərilən

**priceless** ['praɪslɪs] *adj* **1.** çox qiymətli, misli-bərabəri olmayan, çox baha; qiymətsiz *(yəni qiyməti bilinməyən)*; **~ jewels** qiymətsiz/çox qiymətli daş-qaşlar; **~ paintings** çox qiymətli şəkillər; **~ treasures** misli-bərabəri olmayan/ çox qiymətli xəzinələr; **2.** *arx.* heç bir dəyəri/qiyməti olmayan, dəyərsiz; **3.** zarafatcıl, hənəkcil; gülməli; **a ~ fellow** zarafatcıl oğlan; *He looks absolutely priceless in that hat Bu papaqda o, çox gülməli görünür*

**prick**[1] [prɪk] *n* **1.** tikan *(bitkidə)*; **2.** *tex.* mil uc, çıxıntı, diş; **3.** batırma, batırılma, sancma; deşik, dəlik, deşmə, dəlmə; **the ~ made by a needle** iynənin açdığı deşik; **to feel a slight ~** deşmədən yüngül ağrı hiss etmək; **the ~ of conscience** vicdan əzabı; **4.** *biz;* **5.** *bayt.* ətə girmə, əti zədələmə *(atı nallayarkən)*; **6.** dovşan izi/ləpiri; **7.** *amer.* fırıldaqçı, yaramaz, özündən razı, səfeh



**prick**[2] [prɪk] *v* **1.** sancmaq, batırmaq; **to ~** ***smb.*** **with a pin** bir kəsə sancaq batırmaq; *The thorns of roses prick badly Qızılgüllərin tikanı çox pis batır*; **2.** deşmək, dəlmək, deşik/dəlik açmaq; *A nail pricked the tyre Mismar şini/təkəri deşdi*; **to ~ holes in paper with a pin** sancaqla kağızda deşik açmaq; **3.** əzab/əziyyət vermək, incitmək; *My conscience pricks me Vicdanım mənə əziyyət verir/məni incidir*; **4.** sancmaq, batırmaq, soxmaq, itiuclu bir şeylə zərbə endirmək; **5.** nallamaq *(atı)*; **6.** işarə qoymaq *(siyahıda)*; **7.** iz qoymaq *(dovşan haq.)*; **8.** turşumaq, qıcqırmaq *(şərab, pivə və s. haq.)*; **to ~ in/off/out** şitil edib başqa yerdə əkmək *(bitkini)*; **to ~ up** dik çıxmaq/durmaq; *The spire pricks up into the sky Şpil (binanın təpəsindəki uzun mil) göyə tərəf dik durur*;

◊ **to ~** ***one's*** **ears** qulaqlarını şəkləmək, diqqətlə qulaq asmaq

**prickle**[1] ['prɪkl] *n* **1.** tikan *(bitkidə)*; **2.** tikan *(kirpidə, oxlu kirpidə və s.)*

**prickle**[2] ['prɪkl] *v* sancmaq, batırmaq; deşmək, dəlmək; batırmaq *(ucuşiş silahla)*

**prickly** ['prɪklɪ] *adj* **1.** tikanlı; iynəli; ucuşiş, batan; **~ rose-bushes** tikanlı qızılgül kolları; **2.** tündməcaz, çılğın; **3.** dalayan; **~ woolen underclothes** dalayan yun alt paltarı

**pride**[1] [praɪd] *n* **1.** iftixar, iftixar hissi, fəxr, vüqar, məğrurluq, təkəbbür, lovğalıq; **to feel ~ in** ***smth.*** bir şeydən iftixar hissi duymaq; **to take (a) ~ in** ***smth.*** bir şeylə fəxr etmək; *The boy is his parents' pride Oğlan valideynlərinin fəxridir*; **2.** şəxsi ləyaqət, özünə hörmət hissi, özünə hörmət etmə, heysiyyət *(həm də* **proper ~***)*; **false ~** şöhrətpərəstlik, şöhrət düşkünlüyü; *Her pride was hurt Onun heysiyyətinə/ ləyaqətinə toxunmuşdular*; **3.** ən yüksək nöqtə/dərəcə; tərəqqi, yüksəliş, inkişaf; çiçəklənmə dövrü; **in the ~ of youth** gəncliyin çiçəklənən dövründə; **in the full ~ of harvest** məhsul yığımının qızğın dövründə; **4.** *şair.* dəbdəbə, cah-calal

**pride**[2] [praɪd] *v* fəxr etmək; **to ~ oneself on/upon** ***smth.*** bir şeylə fəxr etmək; *He prided himself upon his skill O, öz ustalığı ilə fəxr edirdi; She prided herself on her ability to speak 8 languages/on knowing 8 languages O, 8 dildə danışmağı /8 dil bilməyi ilə fəxr edirdi*

**priest** [pri:st] *n* keşiş *(xüs. katolik kilsəsində)*

**priestess** ['pri:stɪs] *n* kahinə

**priesthood** ['pri:sthʊd] *n* **1.** keşişlik, keşiş rütbəsi; **2.** *top.i* ruhanilər, din xadimləri

**prig** [prɪg] *n* pedant; özünübəyənən, özündən razı olan, öz nöqsanını görməyən, özünü başqalarından yuxarı /üstün tutan *(adam)*

**priggish** ['prɪgɪʃ] *adj* pedant; özünübəyənən, özündən razı olan, öz nöqsanını görməyən

**prim**[1] [prɪm] *adj* ciddi, zabitəli, rəsmiyyətpərəst; rəsmi; süni, qeyri-təbii; **~ smile** suni təbəssüm

**prim**[2] [prɪm] *v* ciddi/rəsmi görkəm almaq; **to ~** ***one's*** **lips** dodaqlarını sıxmaq

**primacy** ['praɪməsɪ] *n* **1.** birincilik, birinci yer; üstünlük, başçılıq; **2.** baş yepiskop/keşiş rütbəsi

**prima donna** ['pri:mə'dɒnə] *n* primadonna *(operada baş rolları ifa edən aktrisa)*

**primal** ['praɪml] *adj* **1.** ən birinci, əvvəlinci, əvvəlki, ən erkən; primitiv, ibtidai, ən sadə; **2.** əsas, baş, vacib, ən mühüm/zəruri; **~ councillors** baş məsləhətçilər/ müşavirlər

**primary**[1] ['praɪmərɪ] *n amer. hər hansı bir partiyanın gələcək seçkilərə namizəd irəli sürmək üçün apardığı ilkin seçki/səsvermə*

**primary**[2] ['praɪmərɪ] *adj* **1.** ən birinci, ilk, əsas, əvvəlinci, ən erkən; **~ source** ilk/əsas mənbə; **2.** ibtidai; **~ education** ibtidai təhsil; **~ school** ibtidai məktəb; **3.** ən başlıca/ vacib/əsas; **~ necessities** gündəlik lazım olan ən vacib şeylər; **a matter of ~ importance** birinci dərəcəli/əhəmiyyətli məsələ; **~ resources** əsas/ başlıca ehtiyatlar; **~ planets** əsas planetlər/səyyarələr *(yəni günəş sisteminin planetləri)*; **~ stress** əsas vurğu

**prime**[1] [praɪm] *n* **1.** başlanğıc, başlanğıc dövr; **2.** çiçəklənmə, çiçəklənmə dövrü; **in the ~ of life** ömrün çiçəklənmə dövründə; *He was 40 years old, and still in the prime of life Onun 40 yaşı vardı, lakin hələ də həyatın çiçəklənmə dövründə idi; Many young soldiers have been cut off in their prime Çox gənc əsgərlər ömürlərinin çiçəkləndiyi dövrdə həlak olublar*; **3.** *mus.* prima *(qammanın birinci əsas səsi; simli musiqi alətinin birinci simi)*, əsas ton

**prime**[2] [praɪm] *adj* **1.** ən birinci, əvvəlinci, ilk; **the ~ cause** ən birinci səbəb; **2.** ilkin, başlıca; **the ~ postulate of his theory** onun nəzəriyyəsinin ilkin/başlıca müddəası; **~ advantage** başlıca üstünlük; **~ cost** *siya. iq.* maya dəyəri; **3.** sadə; **~ number** *riyaz.* sadə rəqəm; **4.** əsas; birinci dərəcəli; **of ~ importance** birinci dərəcəli əhəmiyyət; **the ~ factor** əsas faktor; **articles of ~ necessity** gündəlik tələbat şeyləri; **5.** əla, çox yaxşı; **in ~ condition** əla vəziyyətdə; **~ beef** əla mal əti

**prime**[3] [praɪm] *v* I **1.** *hərb.* alışdırmaq, alovlandırmaq, yandırmaq; **2.** fitil və ya partlayıcı maddə qoymaq *(bombaya və s.)*; **3.** *tex.* doldurmaq *(mühərriki yanacaqla)*, tökmək *(yanacaq)*; **4.** *d.d.* içirtmək, içirib kefləndirmək; yedizdirmək, yedizdirib doyurmaq; **5.** əvvəlcədən məlumat/ təlimat vermək; *The witness had been primed by a lawyer Vəkil şahidə əvvəlcədən təlimat vermişdi*; **6.** astarlamaq, astar çəkmək *(rənglə)*;

◊ **to ~ the pump** stimullaşdırmaq, stimul yaratmaq, həvəsləndirmək, şövqləndirmək

**prime** [praɪm] *v* II kiçik fasilələrlə təkrar olunmaq *(qabarma və çəkilmə haq.)*

**prime** [praɪm] *v* III sudan tullanmaq/atılmaq *(balıq haq.)*

**Prime Minister** ['praım'mınıstər] *n* baş nazir
**primer** ['praımər] *n* **1.** əlifba kitabı; **2.** dua kitabı
**primeval** [praı'mi:vl] *adj* ibtidai; çox qədim, köhnə; ~ **forests** baltadəymәmiş qədim meşələr; ~ **rocks** çox qədim qayalar; ~ **desires** köhnə arzular
**primitive**[1] ['prımıtıv] *n* **1.** ibtidai adam; **2.** *dilç.* kök söz; **3.** əsas rəng; **4.** intibah dövründən əvvəlki rəssam və ya heykəltəraş
**primitive**[2] ['prımıtıv] *adj* **1.** ibtidai, çox qədim; ~ **man** ibtidai adam; ~ **culture** çox qədim/ibtidai mədəniyyət; **2.** primitiv, ən sadə; ~ **tools** primitiv/ən sadə alətlər; ~ **habits** primitiv adətlər; **to live in ~ fashion** sadə həyat sürmək; **3.** köhnə modalı, dəbdən düşmüş; **her very ~ wardrobe** onun köhnə modalı qarderobu; **4.** ilkin, əsas; ~ **cause** ilkin/əsas səbəb
**primrose** ['prımrouz] *n* **1.** *bot.* novruzgülü; primula *(çoxillik bəzək bitkisi)*; **2.** açıq-sarı rəng, limon rəngi *(həm də ~ **colour**)*;
◊ ~ **path** gül-çiçək səpilmiş/güllü-çiçəkli yol
**prince** [prıns] *n* **1.** prins, şahzadə; **royal** ~ vəliəhd prins/şahzadə; kralın böyük oğlu; ~ **of the blood royal** kral qanından olan prins/şahzadə; **2.** knyaz *(qədim Rusiyada qoşun sərkərdəsi və vilayət hakimi; inqilabdan əvvəl Rusiyada xüsusi xidmətlər üçün verilən və nəslən keçən fəxri rütbə)*
**princedom** ['prınsdəm] *n* **1.** prins/şahzadə rütbəsi; knyaz ləyaqəti; **2.** prins/şahzadə malikanəsi; knyazlıq
**princess** [prın'ses] *n* **1.** prinses, şahzadə qız/xanım; ~ **royal** kralın böyük qızı; **2.** knyaginya, knyaz arvadı; knyaz qızı
**principal**[1] ['prınsəpl] *n* **1.** başçı, rəis; müəssisə sahibi/başçısı; **the ~ of a firm** firmanın başçısı/sahibi; **2.** universitetin rektoru, kollecin müdiri; **the Principal of Baki University** Bakı Universitetinin rektoru; **3.** *amer.* məktəb direktoru; **4.** ulduz, aparıcı aktyor və ya aktrisa; **5.** *hüq.* əsas cinayətkar; **6.** əsas borclu
**principal**[2] ['prınsəpl] *adj* **1.** əsas, başlıca; ən mühüm; ~ **cause** əsas/başlıca səbəb; ~ **towns** əsas şəhərlər; ~ **rivers** əsas çaylar; *The Dnieper is one of the principal rivers of Europe Dnepr Avropanın əsas çaylarından biridir*; **2.** *qram.* baş; ~ **clause** baş cümlə
**principally** ['prınsəpəlı] *adv* başlıca olaraq, əsasən, xüsusilə; *The scheme failed principally because of a lack of finance Plan əsasən/başlıca olaraq maliyyə çatışmazlığına görə puça çıxdı/baş tutmadı*
**principle** ['prınsəpl] *n* **1.** prinsip, əsas, qanun; ~**s of war** müharibənin qanunları; ~ **of linguistics** dilçiliyin əsasları; **the basic ~s of geometry** həndəsənin əsasları/əsas qanunları; ~ **of action and reaction** təsirin və əks-təsirin bərabərlik qanunu; ~ **of universal gravitation** ümumdünya cazibə qanunu; **2.** norma; əsas qayda; prinsip; **unanimity** ~, ~ **of unanimity** həmrəylik prinsipi; **in** ~ əsasən; **on** ~ prinsipə görə; **a man of** ~ prinsipial /prinsipli adam; **a man of no ~s** prinsipsiz adam; **to stick to** *one's* ~**s** öz prinsipinə sadiq olmaq/qalmaq; **the ~s of a political party** siyasi partiyanın prinsipləri; **3.** mənbə, qaynaq, ilk mənbə; mahiyyət
**principled** ['prınsəpld] *adj* prinsipli, möhkəm prinsipi olan; **a high— man** yüksək prinsipli adam
**print**[1] [prınt] *n* **1.** iz, ləpir; ~ **of a foot upon the sand** qum üzərində ayaq izi; **sorrow's ~ upon his face** onun üzündə kədərin izi; *Sorrow had left its print on her face Kədər onun sifətində/üzündə iz buraxmışdı*; **to leave** *one's* ~**s in the snow** qar üzərində iz buraxmaq; *The lion left its prints in the sand Aslan qum üzərində iz buraxdı /qoydu*; **2.** şrift *(mətbəə hürufatı)*; çap; **in large/in small** ~ iri/xırda şriftlə; *I can't read small prints without my glasses Mən eynəksiz xırda şriftləri oxuya bilmirəm*; **to rush into** ~ materialı tələsik çapa göndərmək; **3.** çap nəşri, qəzet, jurnal; **4.** *amer.* qəzet kağızı; **5.** ştamp
**print**[2] [prınt] *v* **1.** çap etmək; **to ~ books/ newspapers** kitab/qəzet çap etmək; **2.** nəşr/dərc etmək; *Where did he have his book printed? O, kitabını harada nəşr etdirib?* **3.** çap hərflərilə yazmaq; **4.** iz buraxmaq/ qoymaq; *The mark of a foot was printed on the snow Qar üzərində ayaq izi vardı*; **5.** *d.d.* barmaq izini götürmək; **6.** dərin iz buraxmaq, həkk olunmaq *(yaddaşda)*; **to ~ on the memory** yaddaşda dərin iz buraxmaq, yaddaşa həkk olunmaq
**printable** ['prıntəbl] *adj* **1.** çap oluna bilən, çap olunmağa layiq; **2.** çap üçün yarayan *(kağız haq.)*
**printed** ['prıntıd] *adj* çap; çap edilmiş, basılmış *(mətbəədə)*; ~ **matter** çap edilmiş material; ~ **as manuscript** əlyazması hüququnda çap edilmiş
**printer** ['prıntər] *n* **1.** çapçı; **2.** tipoqrafiya sahibi; **3.** çap dəzgahı/maşını
**printing**[1] ['prıntıŋ] *n* **1.** çap, çap etmə/edilmə; basma, basılma; *The invention of printing caused important changes in society Çapın kəşfi/kəşf edilməsi cəmiyyətdə əhəmiyyətli dəyişikliklərə səbəb oldu*; **2.** *poliqr.* tiraj *(çap edilmiş kitabın, qəzetin, jurnalın və s. sayı)*; **a first ~ of 5000 copies** ilk çap olunan 5000 tiraj; *This is the third printing of the book Bu, kitabın üçüncü çapıdır/nəşridir*
**printing**[2] ['prıntıŋ] *adj* mətbəə, çap; **a ~ error** çap/ mətbəə xətası *(səhvi)*; ~ **house,** ~ **office,** ~ **works** tipoqrafiya, çapxana
**printless** ['prıntlıs] *adj* izsiz, izsiz-soraqsız, itib-batmış, izsiz-tozsuz; **a ~ escape** izsiz-tozsuz yox olma
**prior** [praıər] *adj* **1.** əvvəlki, qabaqkı; ~ **obligation** əvvəlki/ qabaqkı öhdəlik; **2.** daha vacib, birinci növbəli/ dərəcəli, təxirəsalınmaz; ~ **claim** birinci dərəcəli tələb/iddia



**priority**[1] [praı'ɔrıtı] *n* **1.** prioritet, üstünlük; birincilik; ~ **of invention** kəşfdə birincilik; **2.** təcililik; növbəlilik qaydası; **first** ~ birinci növbədə duran, təxirəsalınmazlıq; **of high** ~ təxirəsalınmaz, birinci növbədə duran, təcili *(iş, vəzifə və s. haq.)*; **to observe the rules of** ~ ardıcıllıq qaydalarına riayət etmək; **to establish an order of** ~ ardıcıllıq qaydası müəyyən etmək
**priority**[2] [praı'ɔrıtı] *adj* üstün, birinci dərəcəli, təxirəsalınmaz; ~ **right** üstün hüquq; **high ~ measures** təxirəsalınmaz tədbirlər; ~ **message** təxirəsalınmaz / təcili məlumat / xəbər
**prior to** ['praıətu] *prep* əvvəl, əvvəlcə, qabaq, qabaqca; *We received no notification prior to the event Biz hadisədən əvvəl heç bir xəbərdarlıq almadıq; Prior to her marriage she was a teacher Ərə getməzdən əvvəl o, müəllim idi*
**priory** ['praıərı] *n* baş monastır nəzdində balaca monastır
**prism** ['prızəm] *n* prizma *(həndəsi cisim)*
**prismatic** [prız'mætık] *adj* **1.** *riyaz.* prizmaşəkilli, prizmavarı, prizmayabənzər, prizmayaoxşar; **2.** prizmalı; ~ **binoculars** prizmalı durbin/ binokl; **a ~ compass** prizmalı kompas
**prison** ['prızn] *n* həbs, dustaqxana, məhbəs, həbsxana, qazamat; **to cast/to put into ~** dustaqxanaya/həbsxanaya atmaq/salmaq; **to lie/to be in ~** həbsxanada/həbsdə olmaq; **to be sent to ~** həbsə məhkum edilmək/olunmaq; *He was sent to prison for five years Onu beş il həbsə məhkum etdilər*; **to break (out of) ~, to escape from ~** həbsdən/həbsxanadan qaçmaq; **to be released from ~** həbsdən azad olunmaq; **keeper of a ~** həbsxana/ dustaqxana nəzarətçisi
**prisoner** ['prıznər] *n* **1.** dustaq, məhbus; **political ~** siyasi məhbus; ~ **of state, state ~** siyasi dustaq; **to keep** *smb.* ~ bir kəsi həbsdə saxlamaq; **2.** müttəhim; **3.** əsir; ~**s of war** müharibə əsirləri; **to take/to capture** *smb.* ~ bir kəsi əsir almaq; **to make** *smb.* ~ bir kəsi əsir etmək; *They are holding his daughter prisoner and demanding a ransom of $ 50000 Onlar onun qızını əsir saxlayır və qızı azad etmək üçün 50000 dollar pul tələb edirlər*; ~ **of love** eşqin/məhəbbətin əsiri; *Majnun was prisoner of love Məcnun eşqin əsiri idi*
**pristine** ['prıstaın] *adj* **1.** qədim, çox köhnə; əvvəlki; keçmiş, ötmüş, olmuş; **2.** təzə, təptəzə; təmiz, əldəyməmiş; *The car was in pristine condition Maşın təptəzə idi*
**privacy** ['praıvəsı] *n* **1.** təklik, tənhalıq, yalqızlıq; **to live in absolute ~** tam təklikdə/ tənhalıqda yaşamaq; **2.** sirr, gizlilik, məxfilik; *I tell you this in strict privacy Mən bunu sənə/sizə tam gizli/ məxfi olaraq deyirəm*; **3.** məhrəmlik; səmimilik, yaxınlıq, dostluq
**private**[1] ['praıvıt] *n* **1.** *hərb.* sıravi əsgər; **2.** *pl* xarici cinsiyyət orqanları;
◊ **in ~** gizli, məxfi; *The girl asked to see him in private Qız ondan gizli görüşməyi xahiş etdi*
**private**[2] ['praıvıt] *adj* **1.** xüsusi, özəl, şəxsi; ~ **property** xüsusi mülkiyyət; **a ~ school/ hospital/ bank /university** özəl məktəb/ xəstəxana/bank/universitet; **a ~ secretary** şəxsi katib; **a ~ income** şəxsi gəlir; **a ~ chair/table** şəxsi stul/stol; **a ~ letter** şəxsi məktub; *This is my private opinion Bu, mənim şəxsi fikrimdir /rəyimdir*; **2.** sirr verməyən, öz fikrini/niyyətini/ duyğularını gizli saxlayan, dili qarnında; *He's a rather private person O, çox dili qarnında adamdır*; **3.** gizli, məxfi; **a ~ meeting** gizli/məxfi iclas; ~ **information** gizli/ məxfi məlumat; *I'd like a private chat with you Mən səninlə/sizinlə gizli danışmaq istərdim*; **4.** xəlvəti, sakit; *Let's find a private place where we can sit and talk Gəl/Gəlin bir xəlvəti/sakit yer tapaq, oturub söhbət edək*; **5.** qeyri-rəsmi; **a ~ person** qeyri-rəsmi şəxs; **to speak/to act in** *one's* ~ **capacity** qeyri-rəsmi şəxs kimi danışmaq/hərəkət etmək; *The Queen is about to make a private visit to Canada Kraliça Kanadaya qeyri-rəsmi görüşə getməyə hazırlaşır*
**privately** ['praıvıtlı] *adv* gizli, məxfi, gizlicə, məxfi/gizli olaraq; *The matter was arranged privately Məsələ gizli/məxfi/xəlvəti olaraq qaydaya salındı*
**privation** [praı'veıʃn] *n* yoxsulluq, ehtiyac, məhrumiyyət; **to suffer many ~s** çox yoxsulluqdan/ehtiyacdan çox əziyyət çəkmək
**privilege**[1] ['prıvılıdʒ] *n* **1.** imtiyaz, üstünlük; **personal ~** şəxsi imtiyaz; **diplomatic ~s** diplomatik imtiyazlar; *In countries where there are still not many schools, education is a privilege Məktəblərin hələ də çox olmadığı ölkələrdə savadlılıq imtiyaz sayılır*; **2.** toxunulmazlıq; **parliamentary ~** deputat toxunulmazlığı
**privilege**[2] ['prıvılıdʒ] *v* **1.** imtiyaz/üstünlük vermək; **2.** azad etmək *(hər hansı bir məsuliyyətdən və s.)*
**privileged** ['prıvılıdʒd] *adj* **1.** üstün, imtiyazlı, imtiyaza malik, imtiyaz verilmiş; ~ **classes** imtiyazlı/imtiyaza malik siniflər; **to be in a ~ position** imtiyazlı/üstün vəziyyətdə olmaq; **2.** məxfi, gizli; ~ **information** məxfi məlumat
**privy**[1] ['prıvı] *n arx.* ayaqyolu *(xüs. çöldə olan)*
**privy**[2] ['prıvı] *adj* şəxsi, xüsusi; qeyri-rəsmi; gizli, məxfi; **Privy Council** gizli şura; ~ **councillor** gizli şuranın üzvü
**prizable** ['praızəbl] *adj* mükafata layiq; qiymətli
**prize**[1] [praız] *n* **1.** mükafat, bəxşiş, priz; **to be awarded the Nobel ~** Nobel mükafatına layiq görülmək; **to win/to take/to gain first ~** birinci priz almaq; *Her beautiful roses gained first prize at the flower show last year Onun gözəl qızıl gülləri keçən il gül sərgisində birinci priz aldı*; **2.** uduş *(oyunda, lotereyada və s.)*

**prize²** [praɪz] *adj* **1.** priz almış, prizə layiq görülmüş; ~ **cattle** priz almış qaramal; **a ~ rose** priz almış qızıl gül; **2.** mükafat olaraq verilmiş; ~ **money** mükafat olaraq verilmiş pul; **3.** tamam, büsbütün; **a ~ fool/ idiot** ta-mam/ büsbütün gic; *I made a prize fool/idiot of myself Mən özümü tamam gic/axmaq yerinə qoydum*

**prize³** [praɪz] *v* yüksək qiymətləndirmək; **to ~ the affection of *one's* friends** dostlarının sədaqətini yüksək qiymətləndirmək; *We prize liberty more than life Biz azadlığı həyatımızdan yüksək qiymətləndiririk*

**prize-fight** [ˈpraɪzfaɪt] *n* priz almaq üçün yarış *(boks oyununda)*

**prize-fighter** [ˈpraɪz.faɪtəʳ] *n* peşəkar boksçu

**prize-fighting** [ˈpraɪz.faɪtɪŋ] *n* peşəkar boks

**prizeman** [ˈpraɪzmən] *n (pl* **-men** [-mən]) **1.** laureat; **2.** priz alan; **the Nobel ~** Nobel mükafatı laureatı

**prizetaker** [ˈpraɪz.teɪkəʳ] *n* = **prizewinner**

**prizewinner** [ˈpraɪz.wɪnəʳ] *n* priz/mükafat alan *(yarış iştirakçısı)*; laureat; **Nobel ~** Nobel mükafatı laureatı

**probability** [.prɔbəˈbɪlɪtɪ] *n* mümkünlük, ehtimal, imkan, həqiqətə uyğunluq; **calculus of ~** *riyaz.* ehtimal nəzəriyyəsi; **conditional ~** *riyaz.* şərti ehtimal; *There is every probability of success Müvəffəqiyyət üçün hər cür imkan var*; **in all ~** çox güman ki; *In all probability he's already left Çox güman ki, o, artıq çıxıb gedib*

**probable¹** [ˈprɔbəbl] *n* seçiminə ehtimal edilən namizəd; *All four players are probables for the national team Dörd oyunçunun hamısı milli komandaya/taqıma namizəddir*

**probable²** [ˈprɔbəbl] *adj* **1.** mümkün ola bilən, ehtimal edilən; ~ **results** ehtimal edilən nəticələr; **the most ~ cause/ explanation** ən çox ehtimal edilən səbəb/izahat; **2.** həqiqətə uyğun, doğruyaoxşar, inanılacaq, ağılkəsən, ağlabatan; **a hardly ~ story** həqiqətə az oxşayan əhvalat

**probably** [ˈprɔbəblɪ] *adv* ehtimal ki, olsun ki, yəqin ki, güman ki; *It will probably rain Yəqin ki,/Güman ki, /Olsun ki, yağış yağacaq; John probably told his father all about the matter; he usually tells him everything Güman ki, Con məsələ barəsində atasına hər şeyi danışıb; o, adətən atasına hər şeyi danışır*

**probate¹** [ˈproubeɪt] *n* **1.** vəsiyyət, vəsiyyətnamənin məhkəmə tərəfindən təsdiqi/ təsdiq edilməsi; **2.** məhkəmə tərəfindən təsdiq edilmiş vəsiyyətnamənin surəti

**probate²** [ˈproubeɪt] *v amer.* vəsiyyəti/ vəsiyyətnaməni təsdiq etmək

**probation** [prəˈbeɪʃn] *n* **1.** sınaq, təcrübə; **to pass a ~** sınaqdan keçmək; **to be on ~** təcrübədə olmaq; **2.** sınaq dövrü; **three years ~** üçillik sınaq dövrü; **3.** *hüq.* müttəhimi zaminə buraxma *(xüs. həddi-büluğa çatmamışı)*

**probationary** [prəˈbeɪʃnərɪ] *adj* **1.** sınaq; **a ~ period** sınaq dövrü; **a young ~ teacher/ doctor** sınaq dövrü keçən gənc müəllim/ həkim; **2.** sınaqda olan, sınaq dövrü keçən *(şərti məhkum olunmuş şəxs haq.)*

**probationer** [prəˈbeɪʃnəʳ] *n* **1.** stajçı *(təcrübə keçən)*; **2.** üzvlüyə namizəd *(hər hansı bir təşkilata)*; **3.** *kils.* rahibəliyə hazırlanan adam; **4.** şərti məhkum edilmiş *(adam)*

**probe¹** [proub] *n* **1.** *tib.* zond *(orqanizmin daxilini yoxlamaq üçün boru, cihaz)*; **2.** şup *(torpağın altını və s. yoxlamaq üçün burğu şəklində alət)*; **3.** avtomatik elmi-tədqiqat stansiyası; kosmik raket; tədqiqat raketi; **4.** xortumcuq *(həşəratlarda)*; **5.** zondla tədqiq etmə/edilmə; **6.** *amer.* yoxlama, yoxlanma, araşdırma, araşdırılma; təhqiq etmə/edilmə; təhqiqat

**probe²** [proub] *v* **1.** *tib.* zondla tədqiq etmək, zond salmaq; **2.** yoxlamaq, araşdırmaq, öyrənmək, təhqiq etmək; **to ~ deep into the matter** işi dərindən araşdırmaq/öyrənmək, məsələnin dərinliyinə varmaq

**probing** [ˈproubɪŋ] *adj* tədqiqat; sınaq; ~ **questions** tədqiqat məsələləri

**probity** [ˈproubətɪ] *n* düzlük, təmizlik, doğruluq, namusluluq, səmimiyyət; **to raise doubts as to *smb's* ~** bir kəsin təmizliyinə/ səmimiyyətinə qarşı şübhə oyatmaq

**problem¹** [ˈprɔbləm] *n* **1.** problem, məsələ; **the ~ of unemployment** işsizlik problemi; **~s of common interest** ümumi maraq doğuran məsələlər; **to solve a ~** problem həll etmək; **a knotty ~** dolaşıq/ çəlpəşik problem; **serious ~s** ciddi problemlər; *The unemployment problem in this area is getting worse Bu ərazidə/ rayonda işsizlik problemi daha da pisləşir*; **2.** *riyaz.* məsələ; **a mathematical ~** riyazi məsələ; *The little boy can already do simple problems in addition and subtraction Bu balaca oğlan artıq üstəgəlmə və çıxma əməliyyatlarında sadə məsələləri həll edə bilir*

**problem²** [ˈprɔbləm] *adj* dəcəl, nadinc, çətin; **a ~ child** çətin/nadinc uşaq

**problematic** [.prɔbləˈmætɪk] *adj* **1.** problematik, təxmin olunan, fərz edilən; şübhəli; çətin; ~ **questions** çətin məsələlər; *His success is problematic Onun müvəffəqiyyət qazanması şübhəlidir*; **2.** anlaşılmaz; sirli, müəmmalı; **a ~ inscription** sirli/ anlaşılmaz yazı

**problematical** [.prɔbləˈmætɪkl] *adj* = **problematic**

**problematically** [.prɔbləˈmætɪklɪ] *adv* problematik olaraq, şübhəli, müəmmalı, sirli, ikimənalı

**procedural** [prəˈsiːdʒərəl] *adj* **1.** üsul, prosedura; **2.** *hüq.* prosessual; ~ **difficulties** prosessual çətinliklər

**procedure** [prəˈsiːdʒəʳ] *n* **1.** üsul *(bir işin icrası, müzakirəsi üçün qoyulmuş rəsmi qayda)*; **the agreed/ correct/ normal/ usual/ standard ~** razılaşdırılmış/ doğru/ normal/ adi/ standart üsul; **2.** məhkəmə üsulu; **3.** *tex.* texnoloji proses

**proceed** [prəˈsiːd] *v* **1.** davam etdirmək; **to ~ on a journey** səyahəti davam etdirmək; *They proceeded to ask questions Onlar sual verməyi davam etdirdilər*; **2.** davam etmək; *Work is proceeding slowly İş yavaş davam edir; The dinner proceeded in silence Nahar sükut içərisində davam edir*; **3.** yenidən başlamaq, bərpa etmək *(bir işi görməyi)*; *As the light is better, we can proceed our work İşıq daha yaxşı yandığına görə biz işimizi davam etdirə bilərik*; **4.** *hüq.* məhkəmə işini müzakirə etmək; məhkəməyə cəlb etmək; **to ~ against *smb.*** bir kəsə qarşı iş qaldırmaq; **5.** daha yüksək elmi dərəcə almaq; **to ~ to the degree of M.A.** humanitar elmlər üzrə magistr dərəcəsi almaq

**proceeding** [prəˈsiːdɪŋ] *n* **1.** əxlaq, hərəkət, rəftar, davranış; əməl; **a very strange ~ on his part** onun tərəfindən çox qəribə davranış; **2.** iş; **daily ~** cari/gündəlik iş; **3.** *hüq.* məhkəmə araşdırması/üsulu; **to take legal ~s against *smb.*** bir kəsə qarşı cinayət işi qaldırmaq/açmaq; **to stay ~s** məhkəmə işini müvəqqəti dayandırmaq; **4.** *pl* elmi əsərlər *(elmi cəmiyyətin)*; **5.** *pl* məhkəmə protokolları, məhkəmə işi

**proceeds** [ˈprousiːdz] *n* gəlir, mənfəət, hasilat; satışdan hasil olan/əldə edilən pul; **gross ~** ümumi gəlir *(xərci çıxılmamış)*; **net ~** xalis/təmiz gəlir

**process¹** [ˈprouses] *n* **1.** proses *(bir hadisənin gedişi/inkişafı)*; **natural/ psychological ~** təbii /psixoloji proses; **the revolutionary ~** inqilabi proses; **the election ~** seçki prosesi; **the ~ of development/of decay** inkişaf/tənəzzül prosesi; **the ~ of water becoming ice** suyun buza çevrilmə prosesi; **the gradual ~** tədrici proses; **to begin the gradual ~ of reforming the education system** təhsil sisteminin tədrici reformasına başlamaq; **2.** hərəkət, axın; gediş; **in ~ of construction** tikilişin gedişində; **3.** *hüq.* məhkəməyə çağırma, məhkəmənin gedişi; **4.** *tex.* texnoloji proses/rejim/üsul

**process²** [ˈprouses] *v* **1.** *hüq.* iş açmaq, məsələ qaldırmaq; prosesə başlamaq; **2.** emal etmək; **to ~ leather** dəri emal etmək; *Most of the food we buy is processed in some way Biz aldığımız ərzaqların əksəriyyəti bu və ya digər üsulla emal edilir*; **3.** *d.d.* prosesdə iştirak etmək

**processing** [ˈprousesɪŋ] *n* **1.** emal etmə/ edilmə; emal *(adət. kimyəvi və ya hərarətlə)*; **2.** sterilizasiya, sterilləşdirmə *(konserv hazırlayarkən)*; **3.** texnologiya

**procession¹** [prəˈseʃn] *n* **1.** mərasim; **funeral ~** dəfn mərasimi; **to go/to walk in ~** mərasimdə yerimək; *The procession made its way slowly down the hill Mərasim yavaş-yavaş təpədən aşağı yollandı*; **2.** kütləvi yeriş; **in ~** kütləvi şəkildə; *The choir entered the church in procession Xor kütləvi şəkildə kilsəyə daxil oldu*; **3.** çox miqdarda; *An endless procession of visitors came to the house Evə çox qonaq gəldi*; **4.** mərasim iştirakçıları

**procession²** [prəˈseʃn] *v* mərasimdə iştirak etmək; **to ~ a town** şəhəri kütləvi şəkildə gəzmək

**processional** [prəˈseʃənl] *adj* mərasim; **a ~ hymn** mərasim himni

**processual** [prouˈsesjuəl] *adj hüq.* prosessual; ~ **code** prosessual kodeks

**proclaim** [prəˈkleɪm] *v* **1.** elan etmək, təntənə ilə bildirmək/demək; **to ~ war** müharibə elan etmək; **to ~ a republic** respublika elan etmək; *After its independence Azerbaijan was proclaimed a republic Müstəqil olduqdan sonra Azərbaycan respublika elan edildi*; **to ~ *smb.* a traitor** bir kəsi satqın elan etmək; **2.** qadağan/yasaq etmək *(iclası və s.)*; **3.** açıb demək, hamıya bildirmək, nəşr etmək; **to ~ the news** xəbəri hamıya bildirmək/nəşr etmək; **4.** göstərmək, sübut/ təsdiq etmək; *His pronunciation proclaimed that he was an American Onun tələffüzü göstərirdi /sübut edirdi ki, o, amerikandır*

**proclamation** [.prɔkləˈmeɪʃn] *n* **1.** rəsmi elan etmə; deklarasiya; bəyannamə; bəyanat; **to make an official ~** rəsmi bəyanat vermək; **to sign the ~ of independence** müstəqillik haqqında bəyannamə/deklarasiya imzalamaq; **~ of martial law** hərbi vəziyyət elan etmə; **2.** müraciətnamə, çağırış

**proclivity** [prəkˈlɪvɪtɪ] *n* **(to, towards)** həvəs, meyl, arzu, adət *(xüs. pis şeyə)*; **a ~ to idleness** tənbəlliyə meyl

**procrastinate** [prouˈkræstɪneɪt] *v* ləngitmək, yubatmaq, uzatmaq, gecikdirmək, süründürmək, təxirə salmaq; *He procrastinates in every emergency O, təxirəsalınmaz hər şeyi ləngidir/yubadır/gecikdirir*

**procrastination** [prou.kræstɪˈneɪʃn] *n* ləngitmə, yubatma, gecikdirmə, təxirə salma, uzatma, süründürmə

**procreate** [ˈproukrieɪt] *v* nəsil törətmək, doğmaq; **to ~ children** uşaq törətmək/ doğmaq; **to ~ offsprings** nəsil yaratmaq /törətmək

**procreation** [.proukriˈeɪʃn] *n* təkrar istehsal etmə; çoxaltma, törəyib artma, doğub törəmə; uşaq doğma; *They regard sex as only for procreation Onlar hesab edirlər ki, cinsi əlaqə ancaq uşaq doğmaq üçündür*

**procreator** [ˈproukrieɪtəʳ] *n* ata, döllük, damazlıq *(buğa, qoç, aygır və s.)*

**proctor** [ˈprɔktəʳ] *n amer.* **1.** nəzarətçi, gözətçi *(adət. Oksford və Kembric universitetlərində)*; **2.** vəkil, müvəkkil

**procure** [prəˈkjuəʳ] *v* **1.** tapmaq, əldə etmək, axtarıb tapmaq; *This book is very difficult to procure Bu kitabı əldə etmək çox çətindir; Can you*

*procure that rare old book for me? Sən/Siz bu nadir qədim kitabı mənim üçün tapa bilərsənmi?/bilərsinizmi?*; 2. (**for**) ara düzəltmək, oğraşlıq etmək; *He was accused of procuring an under-age girl for unlawful sex O, azyaşlı qızı qanunsuz olaraq cinsi əlaqəyə cəlb etdiyi üçün ittiham edildi*; 3. *arx.* səbəb /bais olmaq; **to ~ *smb.'s* death** bir kəsin ölümünə bais olmaq

**procurement** [prə'kjuəmənt] *n* 1. almaq, əldə etmək; **the ~ of a loan** istiqraz alma; 2. tədarük, təchiz etmə *(avadanlıqla, ləvazimatla və s.)*; 3. aradüzəltmə, oğraşlıq

**procurer** [prə'kjuərə^r] *n* 1. tədarükçü, təchiz edən, mal göndərən; 2. aradüzəldən, vasitəçi, oğraş

**procuress** [prə'kjuərıs] *n* aradüzəldən qadın/ qız, vasitəçi qadın/qız

**prod**[1] [prɔd] *n* 1. dürtmə, yumruq; **to give *smb.* a ~** bir kəsə dürtmə vurmaq; *He gave me a prod in the ribs O mənim qabırğama dürtmə vurdu*; 2. şiştəpəli /sivriuclu alət *(biz, iynə və s.)*

**prod**[2] [prɔd] *v* (**-dd-**) 1. dürtmələmək; sancmaq, batırmaq; **to ~ *smb.* in the ribs with *one's* finger** barmağı ilə bir kəsin qabırğasını dürtmələmək; 2. həvəsləndirmək, həvəsə gətirmək, qızışdırmaq, fitnələmək, təhrik etmək; qıcıqlandırmaq, acıqlandırmaq, əsəbiləşdirmək; **to ~ a lazy student** tənbəl tələbəni həvəsləndirmək/ həvəsə gətirmək

**prodigal** ['prɔdıgl] *adj* 1. bədxərc, israfçı; **a ~ administration** bədxərc/israfçı müdiriyyət; **a ~ slender** bədxərc/israfçı adam; **the ~ son** *bibl.* ata-anasının üzünə ağ olmuş oğul; 2. səxavətli, əliaçıq; **a ~ of benefactions** kömək etməkdə səxavətli; 3. hədsiz, həddən artıq; **~ expenditure** həddən artıq xərclər

**prodigality** [,prɔdı'gælıtı] *n* 1. bədxərclik, israfçılıq; *He was ruined by his prodigality O, bədxərcliyi ucbatından müflisləşdi*; 2. səxavətlilik, əliaçıqlıq; **the ~ of nature** təbiətin səxavəti; 3. zənginlik, bolluq, firavanlıq; dövlət

**prodigally** ['prɔdıgəlı] *adv* israfçılıqla, bədxərcliklə; bol-bol, bolluca, çoxluca

**prodigious** [prə'dıdʒəs] *adj* 1. əla, son dərəcə yaxşı/gözəl, valehedici; 2. çox böyük/ iri/yekə, zorba, nəhəng; **~ building** nəhəng bina; **a ~ sum of money** çox böyük məbləğdə pul; **their ~ achievement** onların nəhəng nailiyyətləri; **~ shape** qeyri-adi forma

**prodigiously** [prə'dıdʒəslı] *adv* çox, həddən çox/ziyadə; **a ~ gifted/talented artist** çox istedadlı rəssam

**prodigy** ['prɔdıdʒı] *n* 1. möcüzə; **prodigies of nature** təbiətin möcüzələri; 2. qeyri-adi istedadlı/ qabiliyyətli adam; **an infant/ a child ~** vunderkind, möcüzə uşaq

**produce**[1] ['prɔdju:s] *n* 1. məhsul, məhsullar, məmulat, mal; **home ~** ölkə daxilində istehsal olunan mal; **raw ~** xammal; **the ~ of the factories and mills** fabrik və zavodların məmulatı; 2. kənd təsərrüfatı məhsulları *(həm də* **agricultural ~***)*; 3. nəticə

**produce**[2] [prə'dju:s] *v* 1. təqdim etmək, göstərmək; **to ~ *one's* passport** pasportunu təqdim etmək / göstərmək; 2. tamaşaya qoymaq; **to ~ Shakespearian plays** Şekspirin pyeslərini səhnəyə qoymaq; 3. istehsal etmək, buraxmaq; **to ~ woolen goods** yun mallar istehsal etmək; **to ~ steel** polad istehsal etmək; *Americans have produced more cars than ever this year Amerikanlar bu il başqa illərdən daha çox maşın istehsal etmişlər*; 4. yaratmaq, vücuda gətirmək; **to ~ pictures** şəkillər yaratmaq/ çəkmək; 5. vermək; **fields which ~ heavy crops** bol məhsul verən tarlalar; 6. səbəb/bais olmaq, törətmək; **to ~ a rise in prices** qiymətlərin qalxmasına səbəb olmaq; *His announcement produced a violent reaction among the crowd Onun verdiyi məlumat camaat arasında qızğın/şiddətli reaksiyaya səbəb oldu*

**producer** [prə'dju:sə^r] *n* 1. istehsalçı, istehsal edən; 2. quruluşçu rejissor; 3. tamaşanı və ya film çəkilişini maliyyələşdirən şəxs; 4. *amer.* kinostudiya sahibi

**product** ['prɔdəkt] *n* 1. məhsul, məhsullar, məmulat, mal, şey; **meat/cereal/dairy/ farm ~s** ət/taxıl/süd/kənd təsərrüfatı məhsulları; **finished ~s** hazır mallar/ şeylər; 2. nəticə, yekun; **the ~s of his labour** onun zəhmətinin nəticələri; *His book is the product of several years of research Onun kitabı bir neçə illik tədqiqatın nəticəsidir*; 3. *riyaz.* vurma hasili; *The product of 4 and 10 is 40 4-ün 10-a hasili 40-dır/ 40 eylər*

**production**[1] [prə'dʌkʃn] *n* 1. istehsal, istehsal etmə/ edilmə, hazırlama, hazırlanma; çıxarma; **mass ~** kütləvi istehsal; **energy ~** enerji istehsalı; **car ~** maşın istehsalı; **egg/ butter/milk ~** yumurta/yağ/süd istehsalı; **oil ~** neft istehsalı/çıxarma; **~ of textiles** parça istehsalı; 2. məhsuldarlıq, hasil etmə/ edilmə; **weekly/monthly ~** həftəlik/aylıq hasilat; *The production is falling off Məhsuldarlıq aşağı düşür*; 3. məhsul, məhsullar, məmulat; **the newest ~ of the factories** zavodların ən yeni məhsulları; 4. tamaşa, tamaşaya qoyma/ qoyulma; **a new ~ of "Hamlet"** "Hamlet"in yeni tamaşası; 5. əsər *(ədəbi, incəsənət)*; 6. təqdim etmə *(bileti və s.)*

**production**[2] [prə'dʌkʃn] *adj* istehsal, istehsalat; **~ cost/ processes/difficulties/levels** istehsal dəyəri/ prosesləri/ çətinlikləri/ səviyyələri; **~ control** istehsala nəzarət, istehsalatın tənzimlənməsi; **~ planning** istehsalatın planlaşdırılması; **~ department** istehsalat şöbəsi

**productive** [prə'dʌktıv] *adj* 1. məhsuldar, səmərəli; istehsal, istehsaledici; **a very ~ writer/poet** çox məhsuldar yazıçı/şair; **a very ~ meeting** çox səmərəli iclas; **~ capacity** istehsal tutumu; **~ labour** məhsuldar əmək; **~ forces** məhsuldar qüvvələr; 2. münbit, bərəkətli, məhsuldar; **~ soil** münbit/ məhsuldar torpaq; 3. *dilç.* produktiv, məhsuldar; **~ suffix** produktiv şəkilçi

**productively** [prə'dʌktıvlı] *adv* səmərəli, səmərəli surətdə/olaraq; **to spend *one's* time ~** vaxtını səmərəli keçirmək

**productiveness** [prə'dʌktıvnıs] *n* = **productivity**

**productivity** [,prɔdʌk'tıvıtı] *n* 1. məhsuldarlıq, səmərəlilik; **~ of labour** əməyin məhsuldarlığı; 2. münbitlik, bərəkətlilik; **land in full ~** yüksək məhsuldarlığı olan torpaq

**profess** [prə'fes] *v* 1. açıq etiraf etmək/ boynuna almaq; *He professed his dislike of long speeches O etiraf etdi ki, uzun nitqləri sevmir/xoşlamır*; 2. riyakarlıq/ hiylə etmək; yalandan ...göstərmək/ qoymaq; *They profess extreme regret Onlar özlərini elə göstərdilər ki, guya çox peşmandırlar*; 3. iddia etmək, iddiasında olmaq; **to ~ to be a learned man** alimlik iddiasında olmaq; *I don't profess to be an expert in this subject Mən bu fənn sahəsində özümün ekspert olmağım iddiasında deyiləm*; 4. məşğul olmaq *(müəyyən fəaliyyət növü ilə)*; **to ~ medicine** həkimliklə məşğul olmaq; 5. dərs vermək/ demək; **to ~ history/ physics/ botany/ chemistry, *etc.*** tarix/ fizika/ botanika/ kimya dərsi demək; 6. etiqad etmək, inanmaq; **to ~ Islam** İslama inanmaq/ etiqad etmək; *They professed no religion, but they live honourable lives Onlar heç bir dinə etiqad etmirlər, lakin şərəfli həyat keçirirlər*

**professed** [prə'fest] *adj* 1. açıq, aydın, aşkar; açıqdan-açığa; **~ infidel** açıq/aşkar ateist; **~ enemy of reform** reformanın/islahatın açıq-aşkar düşməni; 2. saxta, uydurma, yalan, yalançı; **a ~ friend** yalan/uydurma dost; **~ excuse** uydurma / saxta bəhanə

**profession** [prə'feʃn] *n* 1. sənət, peşə; **liberal ~s** azad peşələr; **a doctor/a carpenter by ~** sənətcə/sənətinə görə həkim/dülgər; *She is a doctor by profession O, sənətinə görə həkimdir; What's your profession? Sənin/Sizin sənətin/sənətiniz nədir?*; 2. inandırma; məlumat, bəyanat; **~s of friendship** dostluğa inandırma; **insincere ~s** qeyri-səmimi bəyanat; 3. *din.* əhd-peyman; and, söz vermə

**professional**[1] [prə'feʃənl] *n* 1. peşəkar, professional; 2. təcrübəli hərbi kadr

**professional**[2] [prə'feʃənl] *adj* peşəkar, professional; **~ painter/composer/ writer, *etc.*** peşəkar rəssam/ bəstəçi/ yazıçı *və s.*; **~ politician** professional/ peşəkar siyasətçi/siyasi xadim; **~ football /tennis** professional futbol/tennis

**professionalism** [prə'feʃnəlızm] *n* professionalizm, peşəkarlıq

**professor** [prə'fesə^r] *n* *(qısa forması:* **Prof***)* 1. professor *(yüksək ixtisaslı universitet müəllimi)*; **Professor Brown/Mamedov** professor Braun/Məmmədov; *He was made (a) professor at the age of 40 O, 40 yaşında professor oldu*; **a university ~** universitet professoru; 2. *amer.* universitet/kollec müəllimi

**professorate** [prə'fesərıt] *n* 1. professorluq; 2. professura, professorlar

**professoress** [prə'fesərıs] *n* qadın professor

**professorial** [,prɔfə'sɔ:rıəl] *adj* professor, professorluq; **a ~ post** professor/ professorluq vəzifəsi; **~ duties** professorluq vəzifələri

**professorship** [prə'fesəʃıp] *n* professorluq; **to accept/to hold a ~ in History** tarix üzrə professor olmaq/ professor vəzifəsi tutmaq

**proffer**[1] ['prɔfə^r] *n* təklif; **~s of peace** sülh təklifləri

**proffer**[2] ['prɔfə^r] *v* təklif etmək; **to ~ *one's* services/ *one's* help** öz xidmətlərini/ köməyini təklif etmək

**proficiency** [prə'fıʃənsı] *n* təcrübəlilik; sərişdə, təcrübə, bacarıq, məharət; **to develop/ to show/ to increase ~** məharətini/bacarığını inkişaf etdirmək/göstərmək/ artırmaq; **to reach a high level of ~** ustalığın ən yüksək zirvəsinə çatmaq

**proficient**[1] [prə'fıʃnt] *n* yaxşı bilən/ tanınan adam; mütəxəssis, ekspert; **a ~ in the art** incəsənət mütəxəssisi, incəsənəti yaxşı bilən adam

**proficient**[2] [prə'fıʃnt] *adj* mahir, məharətli, qabil, usta, bacarıqlı, təcrübəli; **a ~ driver** mahir/ usta/ təcrübəli sürücü; **to be ~ at operating a computer** kompyüterlə işləməkdə mahir olmaq; *He's proficient in driving a car O, maşın sürməkdə ustadır*

**proficiently** [prə'fıʃəntlı] *adv* məharətlə, mahiranə surətdə, ustalıqla, bacarıqla; **to drive a car ~** maşını məharətlə sürmək

**profile**[1] ['proufaıl] *n* 1. profil, yandan görünüş; *She has a fine profile Onun qəşəng profili var*; **to draw in ~** profildən çəkmək *(şəkli)*; 2. qısa bioqrafik oçerk; 3. *tex.* şaquli kəsik

**profile**[2] ['proufaıl] *v* 1. profildən çəkmək *(şəkil)*; 2. profildən göstərmək; 3. *tex.* profilləmək, düzgün profil vermək

**profit**[1] ['prɔfıt] *n* 1. fayda, xeyir; sərfə, mənfəət, qazanc; **with ~ to *one's* health** sağlamlığının/səhhətinin xeyrinə; *I have read it to my profit Mən onu faydalanmaq üçün oxudum*; **to make *one's* ~ of *smth.*** bir şeydən fayda əldə etmək; **to sell at a ~** qazancına satmaq; *He sold his house at a profit O, evini qazancına satdı*; 2. gəlir; **gross/net ~** ümumi *(xərci çıxılmamış)*/ təmiz gəlir; **excess ~** üstəlik gəlir/qazanc/mənfəət; **to drive a ~** gəlir/qazanc əldə etmək; **to produce/to yield a ~** gəlir gətirmək/vermək

**profit**[2] ['prɔfıt] *v* 1. fayda vermək; gəlir/ qazanc/

xeyir gətirmək, xeyirli olmaq; *It will profit you nothing to do that Onu etmək sənə/sizə heç bir fayda verməyəcək*; 2. istifadə etmək, faydalanmaq; *I'll profit by your experience Mən sənin/sizin təcrübəndən/ təcrübənizdən istifadə edəcəyəm*; 3. fayda götürmək; **to ~ by/over a transaction** alverdən/ sövdədən fayda götürmək

**profitability** [ˌprɔfitəˈbılıtı] *n* = **profitableness**

**profitable** [ˈprɔfıtəbl] *adj* 1. faydalı, xeyirli, sərfəli; **~ advice** faydalı/xeyirli məsləhət; 2. gəlirli, qazanclı, mənfəətli; **~ business** qazanclı biznes; **one of the most ~ airlines in the world** dünyada ən qazanclı/mənfəətli hava yollarından biri

**profitableness** [ˈprɔfıtəblnıs] *n* 1. qazanclılıq, mənfəətlilik, gəlirlilik; 2. yararlılıq, faydalılıq, sərfəlilik

**profitably** [ˈprɔfıtəblı] *adv* faydalı, xeyirli; fayda ilə, qazancla, qazancına; **to run a business ~** bizneslə faydalı surətdə məşğul olmaq; *She spent the day profitably O. gününü faydalı keçirdi*

**profiteer**[1] [ˌprɔfıˈtıəʳ] *n* spekulyant, möhtəkir, alverçi

**profiteer**[2] [ˌprɔfıˈtıəʳ] *v* möhtəkirlik/alver etmək, alverlə məşğul olmaq *(xüs. müharibə dövründə)*

**profitless** [ˈprɔfıtlıs] *adj* 1. faydasız, əbəs, nahaq, hədər; **~ effort** faydasız/əbəs cəhd; 2. gəlirsiz, mənfəətsiz; xeyirsiz, səmərəsiz; **~ business** gəlirsiz/mənfəətsiz biznes/müəssisə

**profligacy** [ˈprɔflıgəsı] *n* 1. əxlaqsızlıq, pozğunluq; 2. israfçılıq, bədxərclik

**profligate** [ˈprɔflıgıt] *n* 1. əxlaqsız, pozğun; 2. israfçı, bədxərc *(adam)*

**profound** [prəˈfaund] *adj* 1. dərin, əsaslı; **~ learning** dərin/əsaslı bilik; **~ respect for *smb.*** bir kəsə dərin hörmət; **~ changes** əsaslı dəyişikliklər; *It contains profound meaning Bunun dərin mənası var;* 2. çətin başa düşülən, dolaşıq; **~ doctrine** dolaşıq doktrina/ nəzəriyyə; 3. tam, tamam; absolyut; **~ rest** tam istirahət; **~ ignorance** tam nadanlıq; **~ indifference** tam laqeydlik; **~ silence** absolyut/ tam sakitlik; 4.: **to make a ~ bow** nəzakətlə /ehtiramla təzim etmək

**profoundly** [prəˈfaundlı] *adv* dərindən, ciddi; **to regret ~** dərindən heyfsilənmək /acımaq/ mütəəssir olmaq; *She was profoundly shaken by the news Xəbər onu dərindən sarsıtdı/mütəəssir etdi*

**profoundness** [prəˈfaundnıs] *n* = **profoundity**

**profundity** [prəˈfʌndıtı] *n* dərinlik; **~ of thought** fikrin dərinliyi; **to doubt the ~ of *smb.'s* knowledge** bir kəsin biliyinin dərinliyinə şübhə etmək

**profuse** [prəˈfju:s] *adj* 1. bol, çox; **~ promises** bol vədlər; **~ tears/thanks/ bleeding** çox göz yaşları/ təşəkkürlər/ qanaxma; 2. səxavətli, əliaçıq; **~ hand** səxavətli əl

**profusely** [prəˈfju:slı] *adv* bol, bol-bol, bolluca, çoxluca, firavan; həddən artıq, sonsuz, dönə-dönə; **to sweat ~** bolluca /çox tərləmək; **to apologize ~** dönə-dönə üzr istəmək; *The bush blossoms all too profusely Kol bütünlüklə çiçəkləyir*

**profusion** [prəˈfju:ʒn] *n* 1. bolluq, çoxluq; sərvət, dövlət; **a ~ of colours/ flowers** rənglərin/ çiçəklərin bolluğu; **a ~ of gifts** hədiyyələrin bolluğu/çoxluğu; *There were flowers in profusion Çoxlu çiçəklər vardı*; 2. səxavət, əliaçıqlıq, comərdlik; 3. israfçılıq, bədxərclik

**progenitor** [prouˈdʒenıtəʳ] *n* 1. ulu baba, əcdad, ata-baba, ulu babalar; 2. sələf; bani; **the ~s of modern art** müasir incəsənətin sələfləri/baniləri

**progeny** [ˈprɔdʒənı] *n* 1. övlad, nəvə-nəticə; nəsil; *He appeared, surrounded by his numerous progeny O, saysız-hesabsız nəvə-nəticəsinin əhatəsində peyda oldu*; 2. ardıcıllar, məsləkdaşlar, tərəfdaşlar; 3. nəticə

**prognosis** [prɔgˈnousıs] *n (pl* **-ses***)* 1. *tib.* proqnoz *(xəstəliyin sonrakı inkişafını əvvəlcədən müəyyənləşdirmə)*; **to make ~** pronoz vermək; 2. proqnostika *(proqnoz vermə sənəti)*; 3. qabaqcadan demə, gələcəyi xəbər vermə

**prognosticate** [prəgˈnɔstıkeıt] *v* qabaqcadan / gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək; **a wind that ~s snow** qar yağacağını qabaqcadan xəbər verən külək

**prognostication** [prəgˌnɔstıˈkeıʃn] *n* 1. qabaqcadan demə/xəbər vermə; **weather ~** hava haqqında snoptik məlumat, havanı əvvəlcədən xəbər vermə; 2. qabaqcadan hiss etmə/ duyma, ürəyə damma; 3. *tib.* proqnoz

**program**[1] [ˈprougræm] *n* = **programme**[1]

**program**[2] [ˈprougræm] *v* = **programme**[2]

**programeer** [ˌprougrəˈmıəʳ] *n d.d.* proqram tərtib edən *(adam)*

**programme**[1] [ˈprougræm] *n* 1. proqram; **party ~** partiya proqramı; **political ~** siyasi proqram; **theatre ~** teatr proqramı; **study ~** tədris proqramı; *He had a heavy programme in his freshman year Birinci kursda onun proqramı ağır idi*; **optional/ compulsion ~** *id.* sərbəst / məcburi proqram; 2. proqram *(elektron-hesablama maşını üçün)*; 3. tamaşa; *The programme was a huge success Tamaşa çox böyük müvəffəqiyyət qazandı*; 4. plan *(iş və s. üçün)*; **my daily ~** mənim gündəlik iş planım; *What's our programme for tomorrow? Sabaha bizim planımız nədir?*

**programme**[2] [ˈprougræm] *v* 1. proqram /plan tutmaq; 2. planlaşdırmaq; 3. proqramlaşdırmaq, proqram tərtib etmək *(elektron-hesablama maşını üçün)*; **to ~ an algorithm** alqoritmi proqramlaşdırmaq; **to ~ *smth.* on a computer** bir şeyi kompyüterdə proqramlaşdırmaq





**programmer** [ˈprougræməʳ] *n* 1. proqramist, proqram tərtib edən; 2. *d.d.* radio üçün proqram tərtib edən məsul şəxs

**programming** [ˈprougræmıŋ] *n* 1. proqram tutma; 2. proqramı yerinə yetirmə

**progress**[1] [ˈprougres] *n* 1. tərəqqi, inkişaf; **age of ~** tərəqqi əsri; **the ~ of science** elmin tərəqqisi/inkişafı; 2. müvəffəqiyyət, nailiyyət; **to make ~ in the study of English** ingilis dilini öyrənməkdə müvəffəqiyyət qazanmaq; 3. irəliləmə, irəliləyiş; *The progress of the army was checked Ordunun irəliləyişi/ irəliləməsi dayandırıldı*; **to make little ~ in the fog** dumanda çətinliklə irəliləmək; 4. inkişaf; gediş; *The disease makes rapid progress Xəstəlik sürətlə inkişaf edir*; 5. gediş; **the ~ of events** hadisələrin gedişi/ inkişafı; **to be in ~** davam etmək; *Negotiations are in progress Danışıqlar davam edir/etməkdədir*

**progress**[2] [prəˈgres] *v* 1. tərəqqi/ inkişaf etmək, irəliləmək; güclənmək, şiddətlənmək; yaxşılaşmaq, təkmilləşmək; *Our country is fast progressing Bizim vətənimiz sürətlə inkişaf edir; The patient is progressing favourably Xəstənin vəziyyəti yaxşılaşır*; 2. nailiyyət/ müvəffəqiyyət qazanmaq; 3. irəliləmək, irəli getmək; *In three hours we hardly progressed at all Üç saat müddətində demək olar ki, biz əsla irəliləyə bilmədik*

**progression** [prəˈgreʃn] *n* 1. irəliləmə, irəliləyiş, hərəkət; hərəkat; 2. ardıcıllıq *(hadisə və s. haq.)*; 3. *riyaz.* silsilə; **geometric ~** həndəsi silsilə

**progressive**[1] [prəˈgresıv] *n* 1. tərəqqipərvər, tərəqqi tərəfdarı; 2. *amer.* mütərəqqi partiyasının üzvü

**progressive**[2] [prəˈgresıv] *adj* 1. mütərəqqi, qabaqcıl; **~ policy** mütərəqqi siyasət; **~ nation** mütərəqqi dövlət; **~ mankind** mütərəqqi/ qabaqcıl bəşəriyyət; **~ ideas** mütərəqqi fikirlər /ideyalar; *He is a young man full of progressive ideas O, çoxlu mütərəqqi ideyalı gənc adamdır*; 2. irəliləyən, artan, yüksələn; **~ advance** yüksələn inkişaf; 3. mütənasib olaraq/ tədricən artan; **~ taxation** mütənasib olaraq artan vergi qoyma; **~ wages** tədricən artan əmək haqqı; 4. *qram.* davamedici; **~ form** davamedici forma

**progressively** [prəgˈresıvlı] *adv* 1. mütərəqqi bir tərzdə, qabaqcıl olaraq; 2. tədriclə, tədricən, yavaş-yavaş

**progressiveness** [prəgˈresıvnıs] *n* mütərəqqilik, proqressivlik

**prohibit** [prəˈhıbıt] *v* 1. qadağan/yasaq etmək; *Smoking in this railway carriage is prohibited Bu dəmiryol vaqonunda papiros çəkmək qadağandır*; 2. mane olmaq, əngəl törətmək; *His small size prohibits his becoming a policeman Kiçikboyluluğu onun polis nəfəri olmağına mane olur*

**prohibited** [prəˈhıbıtıd] *adj* qadağan/yasaq edilən; **~ imports** idxal edilməsi qadağan edilən mallar

**prohibition** [ˌprouıˈbıʃn] *n* 1. qadağan/ yasaq etmə; **the ~ of alcohol** spirtli içkilərin qadağan edilməsi; 2. qadağan, yasaq; **a ~ against shops opening on Sunday** bazar günü mağazaların açılmasına qadağa/yasaq

**prohibitionist** [ˌprouıˈbıʃnıst] *n* spirtli içkilərin satılmasının qadağan edilməsinin tərəfdarı

**prohibitive** [prəˈhıbıtıv] *adj* 1. qadağanedici, yasaqedici; **~ duty** qadağanedici rüsum/ vergi/ gömrük; 2. əlçatmaz, çox yüksək; **~ price** əlçatmaz/ çox yüksək qiymət; **a ~ tax on imported cars** idxal edilən maşınlara qoyulan yüksək vergi

**prohibitory** [prəˈhıbıtərı] *adj* qadağanedici, yasaqedici; **~ law** qadağanedici qanun

**project**[1] [ˈprɔdʒekt] *n* 1. layihə, proyekt, plan; **a research ~** tədqiqat layihəsi/ planı; 2. *amer.* auditoriyadan kənar iş *(tələbələr üçün)*

**project**[2] [ˈprɔdʒekt] *v* 1. layihə düzəltmək/ çəkmək/ hazırlamaq, planlaşdırmaq, plana salmaq; **to ~ a new plan of campaign** kampaniyanın yeni planını tutmaq/ hazırlamaq/tərtib etmək; **to ~ the rebuilding of a street** küçəni yenidən tikmək üçün layihə hazırlamaq; 2. salmaq *(kölgə)*; əks etdirmək *(işığı)*; 3. xəyalən özünü başqa vaxtda hiss etmək, xəyalına gətirmək *(gələcəyi)*; *Let us project our thoughts forward a few centuries Gəl/Gəlin bir neçə əsr qabağı xəyalımıza gətirək*

**projection** [prəˈdʒekʃn] *n* 1. layihələşdirmə, layihəsini çəkmə/tutma; **the ~ of a new canal** yeni kanalın layihəsini çəkmə; 2. proyekt, plan; 3. atma, tullama; 4. əks etdirmə *(işığı və s.)*

**projector** [prəˈdʒektəʳ] *n* 1. projektor *(güclü işıq verən aynalı cihaz)*; 2. proyektant *(layihə verən adam, proyekt müdafiə edən adam)*; layihəçi *(layihə mütəxəssisi)*; 3. xəyalçı, xəyalpərəst, xəyalpərvər; 4. *hərb.* qumbaraatan, bombaatan *(silah)*

**proletarian**[1] [ˌprouləˈteərıən] *n* proletar

**proletarian**[2] [ˌprouləˈteərıən] *adj* proletar; **a ~ revolution** proletar inqilabı

**proletariat** [ˌprouləˈteərıət] *n* proletariat

**proletarization** [ˌproulıteəraıˈzeıʃn] *n* proletarlaşma

**proliferate** [prəˈlıfəreıt] *v* 1. çoxalmaq, artmaq, törəyib artmaq/ çoxalmaq; yayılmaq; *Rumours proliferate Şayiələr yayılır*; 2. artırmaq, çoxaltmaq; əmələ gətirmək, yaratmaq

**proliferation** [prouˌlıfəˈreıʃn] *n* kəmiyyətcə artma; yayma, yayılma, intişar, intişar etdirmə, genişləndirmə; **~ of states** dövlətlərin artması; **~ of nuclear weapons** nüvə silahının yayılması

**prolific** [prəˈlıfık] *adj* 1. barlı, məhsullu, çox bar verən *(bitki)*; məhsuldar; tez artan /çoxalan, törəyib artan *(insan, heyvan, həm də məc.)*; **~ writer/painter, *etc*.** məhsuldar yazıçı/rəssam

*və s.* 2. münbit, məhsuldar, bəhərli *(torpaq)*; 3. çox, bol *(məhsul)*; **a ~ year for apples** bol alma məhsulu verən il

**prolificacy** [prə'lıfıkəsı] *n* 1. barlılıq, məhsulluluq, səmərəlilik; artma/ törəmə/bar vermə/ nəsil vermə qabiliyyəti; 2. münbitlik, məhsuldarlıq

**prolix** ['prouliks] *adj* cansıxıcı, usandırıcı, bezikdirici, darıxdırıcı, zəhlətökən, çox maraqsız; **~ speech** cansıxıcı / usandırıcı/ bezikdirici nitq

**prolixity** [prou'lıksıtı] *n* bezikdiricilik, usandırıcılıq, cansıxıcılıq, darıxdırıcılıq

**prolog** ['proulɔ:g] *n amer.* = **prologue**

**prologue** ['proulɔ:g] *n* 1. proloq, giriş *(ədəbi əsərdə)*; 2. *məc.* başlanğıc; **in the ~ of life** həyatın başlanğıcında; 3. proloq deyən/ oxuyan aktyor

**prolong** [prə'lɔŋ] *v* 1. uzatmaq, davam etdirmək, davam etmək, uzununa artırmaq; **to ~ a line/a road** xətti/yolu uzatmaq; 2. artırmaq, uzatmaq *(ömrü, müddəti)*; **to ~ *one's* life** ömrünü uzatmaq; **to ~ a visit** viziti/səfəri artırmaq /uzatmaq; *They prolonged their visit by a few days Onlar vizitlərini bir neçə gün uzatdılar*

**prolongation** [,proulɔŋ'geıʃn] *n* 1. uzatma, uzadılma *(müddəti, vaxtı)*; müddət; **~ of a term** müddəti uzatma; **the artificial ~ of human life** insan ömrünün süni yolla uzadılması; 2. *hərb.* hərbi xidməti uzatma; 3. *id.* oyunun vaxtını uzatma

**prolonged** [prə'lɔŋd] *adj* uzunsürən, sürəkli, uzunmüddətli; **~ applause** sürəkli alqışlar; **~ negotiations** uzunsürən /uzunmüddətli danışıqlar

**promenade¹** [,prɔmı'na:d] *n* 1. gəzinti, gəzmə, seyr, ayaqseyri; 2. gəzinti yeri

**promenade²** [,prɔmı'na:d] *v* 1. gəzmək, gəzişmək, gəzinmək; **to ~ in the park/ in the streets** parkda/ küçələrdə gəzmək; 2. gəzintiyə çıxmaq/ çıxartmaq

**prominence** ['prɔmınəns] *n* 1. çıxıntı, qabarıqlıq, qabarıq *(yer)*; əyri-üyrülük, kələ-kötürlük; **a ~ in the middle of a plain** düzənliyin ortasında qabarıqlıq /qabarıq yer; 2. görkəmli/xüsusi yer tutan; **a person of considerable ~** görkəmli /xüsusi yer tutan adam; *Great prominence has been given by most newspapers to the President's speech Qəzetlərin əksəriyyəti Prezidentin nitqinə xüsusi yer veriblər*

**prominent** ['prɔmınənt] *adj* 1. qabağa çıxmış/çıxan; **~ teeth** qabağa çıxan dişlər; 2. dombalan; **~ eyes** dombalan gözlər; 3. görünən, gözəçarpan; **~ building** gözəçarpan bina; 4. məşhur, tanınmış; **our ~ scientists/ painters/ singers** *etc.* bizim məşhur alimlərimiz/ rəssamlarımız/ müğənnilərimiz *və s.*

**promiscuity** [,prɔmıs'kju:ıtı] *n* 1. müxtəliflik, müxtəlif tərkiblilik, cürbəcürlük; qarışıq/ qatışıq olma; 2. ağına-bozuna baxmama, tələbkar olmama, fərq qoymama *(xüs. münasibətlərdə)*; 3. promiskuitet *(ibtidai insan cəmiyyətində cinsi əlaqənin nizamsız olması)*

**promiscuous** [prə'mıskjuəs] *adj* 1. müxtəlif, müxtəlifcinsli; qarışıq, cürbəcür, tərkibcə müxtəlif; **~ crowd** tərkibcə müxtəlif camaat; **~ mass** müxtəlifcinsli kütlə; 2. nizamsız, qarmaqarışıq, dağınıq, səliqəsiz; **~ heap** qarma-qarışıq yığın/topa/ qalaq; 3. heç bir şeyə fərq qoymayan, yaxşıya-yamana baxmayan; tələbkar olmayan; 4. *d.d.* təsadüfi, qeyri-müntəzəm; **~ eating** qeyri-müntəzəm yemə/qidalanma

**promiscuously** [prə'mıskjuəslı] *adv* 1. təsadüfi olaraq, təsadüfən, bilmədən; 2. nizamsız/ səliqəsiz halda; fərq qoymadan, ağına-bozuna baxmadan; *He read continually and promiscuously O, mütəmadi və ağına-bozuna baxmadan oxudu*

**promise¹** ['prɔmıs] *n* 1. vəd, vəd etmə/ vermə, söz vermə; **to make/to give a ~** vəd/söz vermək; **to keep/ to carry out *one's* ~** vədini yerinə yetirmək; **to break *one's* ~, to go back on *one's* ~** vədini yerinə yetirməmək, vədinə xilaf çıxmaq; **a ~ to help/ of help** kömək etmək üçün vəd/söz vermə; 2. vəd edilən/edilmiş şey; 3. ümid; **a youth of great/of high ~** böyük ümidverici gənc; **to give/ to show ~** ümid vermək

**promise²** ['prɔmıs] *v* 1. vəd/söz vermək; vəd etmək; öhdəsinə/boynuna götürmək; *I can't promise, but I'll do my best Mən söz verə bilmirəm, lakin əlimdən gələni edəcəm; He promised to help me O mənə kömək edəcəyinə söz/vəd verdi; The girl promised me (that) she would be there Qız mənə söz verdi ki, orada olacaq; I promise to come in time Mən söz verirəm ki, vaxtında gələcəm*; 2. ümid vermək, vəd etmək, qabaqcadan xəbər vermək/bildirmək; *The weather promises large crops Hava bol məhsul olacağına ümid verir*;

◊ *Promise little do much at. söz. Az vəd ver/ve-rin, çox iş gör/görün*

**promising** ['prɔmısıŋ] *adj* çox ümidlər verən, çox şey vəd edən; ümidverici; **a ~ pupil / student/ youth, *etc.*** ümidverici şagird/ tələbə/gənc *və s.*

**promote** [prə'mout] *v* 1. qabağa/irəli çəkmək; rütbəcə yüksəltmək; *He was promoted captain/to the rank of captain Ona kapitan rütbəsi verdilər*; 2. imkan yaratmaq, səbəb olmaq, kömək/himayə etmək; **to ~ trade** ticarətin inkişafına kömək etmək; **to ~ a scheme** planı müdafiə/himayə etmək; **to ~ international understanding** beynəlxalq anlaşmaya kömək etmək; 3. oyatmaq, törətmək, doğurmaq; **to ~ disorder** qarışıqlıq törətmək; 4. növbəti sinfə keçirmək *(şagirdi)*; 5. təsis/təşkil etmək; əsasını/təməlini/binasını qoymaq; yaratmaq; **to ~ a company** cəmiyyət təsis/təşkil etmək; 6. *şahm.* irəliləmək *(piyadanı)*

**promoter** [prə'moutəʳ] *n* 1. hami, himayə edən,



himayəçi, havadar; **~ of charity** xeyriyyə cəmiyyətinin hamisi/himayəçisi; 2. təsis edən, əsasını qoyan; bani

**promotion** [prə'mouʃn] *n* 1. kömək, yardım, kömək/ yardım etmə *(inkişafa)*; həvəsləndirmə, rəğbətləndirmə; **institutions for the ~ of learning** elmi bilikləri yaymağı himayə edən müəssisələr; 2. təhrikçilik, qızışdırıcılıq; 3. vəzifədə irəliləmə/ yüksəlmə; **to obtain/ to get *one's* ~** vəzifədə yüksəlmək; 4. təsis/təşkil etmə; 5. idarə, müəssisə

**prompt¹** [prɔmpt] *n* I yadına/fikrinə salma, gizlicə söyləmə, yavaşcadan demə

**prompt** [prɔmpt] *n* II *tic.* ödəniş/ödənmə günü; ödəniş /ödənmə müddəti; **at a ~ of four months** dördaylıq ödəmə müddətilə, dörd ay müddətində ödəməklə

**prompt²** [prɔmpt] *adj* 1. cəld, çevik, çox səyli/çalışqan; **to be ~ to carry (out) an order** əmri yerinə yetirməkdə çevik olmaq; **a ~ assistant** çox çalışqan köməkçi; 2. təcili, təxirəsalınmaz, təxirsiz; yubadılmaz; **a ~ action** təcili/ təxirsiz hərəkət; **~ decisions** təxirəsalınmaz qərarlar; **to give a ~ answer** təcili/dərhal cavab vermək; **~ payment** təxirəsalınmaz/yubadılmaz ödəmə

**prompt³** [prɔmpt] *v* 1. vadar/məcbur/təhrik etmək; həvəs oyatmaq; *What prompted you to do it? Bunu etməyə səni/sizi nə vadar etdi?* 2. yadına/fikrinə salmaq; 3. təlqin etmək, beyninə yeritmək *(fikri)*; oyatmaq, oyandırmaq *(hiss)*; **to ~ hatred** nifrət oyatmaq

**prompt⁴** [prɔmpt] *adv* düz; *The performance will start at 7 o'clock prompt Tamaşa düz saat 7-də başlayacaq/başlanacaq*

**prompt-book** ['prɔmptbuk] *n* pyesin suflyor nüsxəsi

**prompt-box** ['prɔmptbɔks] *n* suflyor budkası

**prompt-copy** ['prɔmpt,kɔpı] *n* = **prompt-book**

**prompter** ['prɔmptəʳ] *n* 1. suflyor; 2. gizlicə söyləyən, pıçıldayan

**prompting** ['prɔmptıŋ] *n* arzu, niyyət, məqsəd; tovlama, təhrik, yoldan çıxartma, azdırma; *At whose prompting was it done? Bu kimin təhrikilə edildi? He did it without any prompting from me O, bunu mənim heç bir təhrikim olmadan etdi*

**promptly** ['prɔmptlı] *adv* 1. tez, cəld, təcili, təxirə salmadan, dərhal; 2. düz, vaxtında, öz vaxtında

**promulgate** ['prɔmlgeıt] *v* 1. rəsmən elan etmək, hamıya bildirmək; təntənə ilə bildirmək /elan etmək; nəşr etmək; **to ~ a decree** dekret dərc etmək; *The American Declaration of Independence was promulgated in January 1776 Amerikanın Müstəqillik Bəyannaməsi 1776-cı ilin yanvar ayında təntənəli surətdə elan edildi*; 2. yaymaq, intişar etdirmək, təbliğ etmək *(nəzəriyyəni, dini əqidəni və s.)*; **to ~ a belief/a theory** dini əqidəni/ nəzəriyyəni yaymaq/təbliğ etmək

**promulgation** [,prɔml'geıʃn] *n* 1. rəsmən elan etmə; **the ~ of a treaty** rəsmən sazişi elan etmə; 2. yayma, təbliğ etmə

**prone** [proun] *adj* 1. üzüüstə, üzüqoylu; **to lie ~** ağzıüstə /üzüüstə uzanmaq; **to fall ~** üzüüstə/ üzüqoylu yıxılmaq; 2. meylli; **to be ~ to illness/ to infection** xəstəliyə/ infeksiyaya meylli olmaq; **land ~ to flooding** daşqına meylli ölkə

**prong¹** [prɔŋ] *n* 1. diş *(daraqda, mişarda və s.)*; 2. qanad *(yabada)*; *One of the prongs of the fork went through his foot Yabanın bir qanadı onun ayağına girdi / batdı*; 3. şaxələnmiş maral buynuzu

**prong²** [prɔŋ] *v* yaba ilə çevirmək/ qaldırmaq *(otu və s.)*

**-pronged** [prɔŋd] *adj mürəkkəb sifət düzəldən komponent*: dişli; **a four- ~ fork** dörddişli çəngəl/yaba

**pronoun** ['prounaun] *n qram.* əvəzlik; **personal/ demonstrative/ interrogative *etc.* ~** şəxs/işarə/sual və s. əvəzliyi

**pronounce** [prə'nauns] *v* 1. elan etmək, bildirmək, demək; **to ~ a judgement** hökm elan etmək; **to ~ an opinion** fikir /rəy bildirmək; *The doctor pronounced that he was fit enough to return to work Həkim dedi ki, o, tam sağalıb və işə qayıda bilər*; 2. tələffüz etmək; *Very few people can pronounce my name properly Çox az adam mənim adımı düzgün tələffüz edə bilir*

**pronounced** [prə'naunst] *adj* 1. gözəçarpan; *He was walking with a pronounced limp O, gözəçarpacaq şikəstliklə yeriyirdi*; 2. kəskin tərzdə/ şəkildə fərqlənən; **~ aptitude for languages** dil öyrənməyə yüksək qabiliyyətli

**pronouncedly** [prə'naunstlı] *adj* qəti, aydın, qəti/aydın /aşkar surətdə, açıq, açıqcasına, açıqdan-açığa; şübhəsiz

**pronouncement** [prə'naunsmənt] *n* 1. elan, bildiriş, elan etmə/edilmə; çıxartma *(qərar, hökm)*; 2. rəsmi bəyanat; **a late ~ of the President** Prezidentin bu yaxınlardakı bəyanatı

**pronto** ['prɔntou] *adv* dərhal, təxirsiz, təxirə salmadan, yubatmadan, tez; *It's got to be done pronto Bu təxirə salmadan/yubatmadan edilməlidir*

**pronunciation** [prə,nʌnsı'eıʃn] *n* tələffüz; **to teach English ~** ingilis dilinin tələffüzünü öyrətmək; *His pronunciation is often faulty Onun tələffüzü tez-tez qüsurlu olur; He speaks according to the northern pronunciation O, şimal tələffüzündə danışır; What is the correct pronunciation of this word? Bu sözün düzgün tələffüzü necədir?*

**proof¹** [pru:f] *n* 1. sübut, dəlil; **to give/to offer ~** sübut vermək; **to show ~** sübut/dəlil göstərmək; **to bring ~** sübut/dəlil gətirmək; *It is not capable of proof Bunu sübut etmək mümkün deyil; I believe what you say; I don't want any proof Mən sənin/sizin dediklərinə /dediklərinizə*

*inanıram, mənə heç bir sübut lazım deyil; We need more proof before we can accuse him of stealing Onu oğurluqda ittiham etməzdən öncə bizə əlavə sübut lazımdır*; 2. yoxlama, sınaq; **to put** *smb./smth.* **to the ~** bir kəsi/şeyi sınaqdan keçirmək; **to stand the ~** yoxlamadan/ sınaqdan keçmək/ çıxmaq; 3. *mətb.* korrektura *(nabor səhvlərinin təshih edilməsi)*; **to correct/to read ~s of a book** kitabın korrekturasını yoxlamaq/oxumaq; 4. tündlük *(alkoqollu içkilərdə)*; *This whisky is 70% proof Bu viskinin tündlüyü 70%-dir*; **above/under ~** lazımi tündlükdən yuxarı /aşağı;

◊ *The proof of the pudding is on the eating* ≅ *Hər şey təcrübədə yoxlanılır, Hər şey nəticəsi ilə ölçülür*

**proof²** [pru:f] *adj* **1.** keçirməyən, buraxmayan *(su, səs, işıq və s. haq.)*; **to be ~ against water** su buraxmayan/keçirməyən olmaq; *This tent is proof against water Bu çadır su keçirmir/buraxmır*; 2. təsirə düşməyən, əlçatmaz, ələ alınmaz; **to be ~ against temptations** nəfsi/tamahı tox olmaq; 3. müəyyən edilmiş *(spirtin tündlüyü haq.)*

**proof³** [pru:f] *v* **1.** keçirməyən/buraxmayan hala salmaq; **to ~ cloth** parçanı su buraxmaz/keçirməz vəziyyətə salmaq; 2. *mətb.* qranka oxumaq

**-proof⁴** [pru:f] *mürəkkəb sözün komponenti: Azərbaycan tükcəsində* **1) -davamlı** *tərkibinə müvafiq gəlir:* fire-**proof** od**adavamlı; 2) keçirməyən, buraxmayan** *sözlərilə tərcümə edilir:* water**proof** su**keçirməyən, su****buraxmayan**

**proofless** [ˈpru:flɪs] *adj* sübutsuz, dəlilsiz, əsassız; **~ charges** əsassız/ sübutsuz ittihamlar

**proof-reader** [ˈpru:fˌri:dəʳ] *n* korrektor

**proof-reading** [ˈpru:fˌri:dɪŋ] *n* korrektura oxuma

**proof-room** [ˈpru:frum] *n* korrektor otağı

**proof-sheet** [ˈpru:fʃi:t] *n mətb.* ottisk, korrektura

**prop¹** [prɒp] *n* I **1.** dayaq, dirək, çəp/çəpinə vurulmuş dayaq/dirək; *Props were used to prevent the roof collapsing Damın uçmasının qarşısını almaq üçün dayaqlardan istifadə edilmişdi*; 2. paya, payacıq *(bitkini bağlamaq üçün)*; 3. arxa, kömək, istinadgah, dayaq; **the ~ of the home** ailənin/evin dayağı

**prop** [prɒp] *n* II *(adət. pl)* əmlak, avadanlıq; **personal ~s** şəxsi əmlak; **stage ~s** səhnə avadanlıqları

**prop²** [prɒp] *v* **1.** *(pt, pp* **-pp-**) dayaq/dirək vurmaq *(həm də* **to ~ up)**; **to ~ up a roof with timbers** dama tirlərdən dayaq vurmaq/vermək; *He was sitting with his chin propped in his hand O, əllərini çənəsinə dayayıb/dirəyib oturmuşdu*; 2. dayamaq, söykəmək; **to ~ a ladder against the wall** nərdivanı divara dayamaq /söykəmək; *He propped his bicycle against the wall O, velosipedini divara söykədi/dayadı*; 3. kömək/müdafiə etmək; *The industry is propped up by the government Sənayeyə dövlət kömək edir/kömək göstərir*

**propaganda** [ˌprɒpəˈgændə] *n* təbliğat, təbliğ, təbliğ etmə; **war ~** müharibə təbliğatı; *There has been a good deal of propaganda about the dangers of smoking Papiros çəkməyin təhlükəsi haqqında çoxlu təbliğat aparılıb*

**propagandist** [ˌprɒpəˈgændɪst] *n* təbliğatçı

**propagandize** [ˌprɒpəˈgændaɪz] *v* təbliğ etmək, təbliğat aparmaq

**propagate** [ˈprɒpəgeɪt] *v* **1.** çoxaltmaq, artırmaq; doğub törətmək, törədib artırmaq; yetişdirmək, becərmək; **to ~ a new breed of cattle** yeni heyvan cinsi yetişdirmək; **to ~ a new variety of plant** yeni növ bitki becərmək/yetişdirmək; 2. artmaq, çoxalmaq, törəyib artmaq; *Most plants propagate by seed Əksər bitkilər toxum vasitəsilə artır; Insects propagate themselves by means of eggs Həşəratlar yumurta qoymaqla artırlar/törəyib artırlar*; 3. yaymaq; yayılmaq, intişar etdirmək; **to ~ infection** infeksiya/ yoluxucu xəstəlik yaymaq; **to ~ rumours** şayiələr yaymaq; 4. nəsildən-nəslə ötürmək/ keçirmək *(xüsusiyyətləri və s.)*; 5. keçmək; *Water easily propagates sound Su səsi asanlıqla keçirir*

**propagation** [ˌprɒpəˈgeɪʃn] *n* **1.** artma, çoxalma, doğub törəmə, törəyib artma; çoxaltma, artırma; **vegetative ~** vegetativ çoxalma; **~ by cuttings** *bağ.* qələmlə/ çiliklə artırma/ çoxaltma; **the ~ of plants from cuttings** bitkiləri çilik-lə/qələmlə artırma; 2. yayma, yayılma; **~ of disease** xəstəliyin yayılması; **~ of ideas** fikrin/ideyaların yayılması

**propagator** [ˈprɒpəgeɪtəʳ] *n* **1.** yayan, yayıcı, intişar etdirən; **to find the ~ of this slander** bu iftiranı yayanı tapmaq; 2. kultivator *(torpaqyumşaldan maşın)*; mikroorqanizmlər yetişdirmək üçün cihaz; 3. istixana; **tomato plants growing in a heated ~** istixanada becərilən pomidor

**propane** [ˈproupeɪn] *n kim.* propan *(təbiətdə tapılan və yanacaq kimi istifadə edilən rəngsiz qaz)*

**propel** [prəˈpel] *v (pt, pp* **-ll-**) hərəkətə gətirmək, irəli hərəkət etdirmək, stimul vermək

**propelled** [prəˈpeld] *adj* hərəkətə gətirilən; **~ by steam** buxarla hərəkətə gətirilən; **a boat ~ by eight oars** səkkiz avarla hərəkətə gətirilən qayıq

**propellent¹** [prəˈpelənt] *n* **1.** hərəkətverici qüvvə; 2. raket üçün yanacaq, reaktiv mühərrik üçün yanacaq

**propellent²** [prəˈpelənt] *adj* hərəkətverici; **~ power** hərəkətverici qüvvə

**propeller** [prəˈpeləʳ] *n* **1.** hərəkətverici *(qüvvə, mexanizm)*; 2. propeller, pər *(təyyarədə)*

**proper** [ˈprɒpəʳ] *adj* **1.** xas, məxsus, aid; xas /məxsus/aid olan; **feelings ~ to mankind** insana/insanlara xas olan hisslər; 2. lazımi qaydada, doğru; **~ receipt** lazımi qaydada/ doğru tərtib edilmiş qəbz; **to administer ~ punishment** lazımi tərzdə cəzalandırmaq; *Do as you think proper Necə bilirsən/bilirsiniz, elə də et/edin*; 3. uyğun, uyğun gələn, münasib; **the ~ word** uyğun/ uyğun gələn söz; **the ~ tool for this job** bu işə münasib alət; 4. ədəbli, ləyaqətli, layiqli; **~ behaviour** ədəbli/ layiqli əxlaq/ davranış; 5. əsl, həqiqi, xalis; *The little boy wanted a proper dog; he didn't want a toy dog Balaca oğlan həqiqi it istəyirdi; oyuncaq it yox; He is a proper fool O, sözün əsl mənasında axmaqdır /gicdir/səfehdir*; 6. *qram.* xüsusi; **~ name/noun** xüsusi ad/isim; 7. *riyaz.* həqiqi; **~ fraction** həqiqi kəsr; 8. *arx.* gözəl, qəşəng; **~ man** gözəl adam; 9. *arx.* öz; **our ~ son** bizim öz oğlumuz; **with my own ~ hands** öz əllərimlə



**properly** [ˈprɒpəlɪ] *adv* **1.** düz, doğru, lazımi qaydada, necə lazımdırsa; **to speak English ~** ingilis dilində düz/lazımi qaydada danışmaq; **a word ~ used** lazımi qaydada/ düz işlədilmiş söz; **to do a thing ~** bir şeyi lazımi qaydada etmək; 2. əslində, əslinə qalsa, doğrusu; *Properly speaking, I ought to go there Əslinə qalsa, mən gərək ora gedim*; 3. ədəblə, ləyaqətlə, mərifətlə, qanacaqla; *Behave properly! Ədəblə/Ləyaqətlə/Mərifətlə davran/davranın!* 4. münasib/uyğun tərzdə; **to dress ~** münasib tərzdə geyinmək

**property** [ˈprɒpətɪ] *n* **1.** mülkiyyət, mal-mülk; **private ~** xüsusi mülkiyyət; **public ~** ictimai mülkiyyət; **personal ~** şəxsi mülkiyyət; **a man of ~** xüsusiyyətçi, mülkiyyətçi, varlı-hallı/dövlətli adam; 2. mülkiyyət hüququ; 3. xüsusiyyət, xassə, keyfiyyət; **the chemical properties of iron** dəmirin kimyəvi xassələri; **plants with healing properties** müalicəvi xassələrə malik bitkilər

**prophecy** [ˈprɒfəsɪ] *n* qabaqcadan demə, gələcəyi xəbər vermə, peyğəmbərlik; **the gift of ~** gələcəyi görmə qabiliyyəti/istedadı

**prophesier** [ˈprɒfɪsaɪəʳ] *n* qabaqcadan / gələcəkdən xəbər verən

**prophesy** [ˈprɒfɪsaɪ] *v (pt, pp* **-sied**) qabaqcadan xəbər vermək, gələcəkdən xəbər vermək, gələcəyi qabaqcadan bildirmək; **to ~ disaster** fəlakəti qabaqcadan xəbər vermək

**prophet** [ˈprɒfɪt] *n* **1.** qabaqcadan /əvvəlcədən xəbər verən, gələcəkdən xəbər verən; 2. *din.* peyğəmbər, rəsul, nəbi; **the Prophet** Məhəmməd Peyğəmbər; 3. xətib, vaiz, moizəçi; təbliğatçı

**prophetess** [ˈprɒfɪtɪs] *n* gələcəkdən xəbər verən qadın/qız, gələcəyi qabaqcadan xəbər verən qadın/qız

**prophetic** [prəˈfetɪk] *adj* peyğəmbər; peyğəmbərcəsinə söylənilmiş/deyilmiş; **~ dream** peyğəmbər yuxusu/ röyası

**prophetical** [ptəˈfetɪkl] *adj* = **prophetic**

**prophetically** [prəˈfetɪklɪ] *adv* peyğəmbərcəsinə, peyğəmbər kimi, peyğəmbərsayağı

**prophylactic¹** [ˌprɒfɪˈlæktɪk] *n* profilaktik tədbir/ vasitə

**prophylactic²** [ˌprɒfɪˈlæktɪk] *adj* profilaktik; **~ treatment** profilaktik müalicə

**propinquity** [prəˈpɪŋkwɪtɪ] *n* **1.** yaxınlıq, qonşuluq; **in close ~ to the house** evin yaxınlığında/qonşuluğunda; **to live in close ~ to each other** bir-birinə yaxın yaşamaq; 2. qan qohumluğu; **degree of ~** qan qohumluğu dərəcəsi; 3. bənzəyiş, oxşayış, oxşarlıq; **~ of ideas** fikirlərin/ ideyaların oxşarlığı

**propitiate** [prəˈpɪʃɪeɪt] *v* sakitləşdirmək, rahatlandırmaq, təskin etmək, könlünü almaq

**propitiation** [prəˌpɪʃɪˈeɪʃn] *n* sakitləşdirmə; rahatlaşdırma, barışdırma, könlünü alma

**propitiatory** [prəˈpɪʃɪətrɪ] *adj* **1.** sakitləşdirici, rahatlaşdırıcı; təsəlliverici; barışdırıcı; 2. günahı yüngülləşdirən; **~ sacrifice** günahı yüngülləşdirən qurban

**propitious** [prəˈpɪʃəs] *adj* **1.** xeyirxah, iltifatlı, meyl/təvəccöh göstərən; mərhəmətli, lütfkar; **~ mood** xeyirxah əhval-ruhiyyə/meyl; **~ smile** iltifatlı/ lütfkar təbəssüm; 2. əlverişli, münasib, müvafiq; **~ weather** əlverişli/ münasib hava; **~ moment** əlverişli/ münasib an; *It is not a propitious time to start a new business Yeni biznes başlamaq üçün əlverişli vaxt deyil*

**propitiously** [prəˈpɪʃəslɪ] *adv* yaxşı, faydalı, əlverişli; xeyirxahcasına, iltifatla; xeyirxah/ iltifatlı bir tərzdə; *The holiday began propitiously but then everything started to go wrong İstirahət yaxşı başladı, amma sonra hər şey korlandı*

**proponent¹** [prəˈpounənt] *n* **1.** təklif/ nəzəriyyə irəli sürən adam; 2. müdafiəçi, müdafiə edən adam *(siyasəti, tədbiri və s.)*

**proponent²** [prəˈpounənt] *adj* **1.** təklif/ nəzəriyyə irəli sürən; 2. müdafiə edən/ tərəfini saxlayan *(siyasəti, tədbiri və s.)*

**proportion¹** [prəˈpɔ:ʃn] *n* **1.** proporsiya; tənasüb, uyğunluq, nisbət; proporsionallıq, mütənasiblik, uyğunluq; tarazlıq; *His arms are long in proportion to the rest of his body Onun qolları bədəninə nisbətdə uzundur*; **payment in ~ to work done** yerinə yetirilmiş işə uyğun əmək haqqı/muzd; *Imports were in proportion to exports İdxal ixraca tənasüb idi; The proportion of men to women in the population has changed so that there are now fewer women and more men Əhali arasında kişi ilə qadın arasında proporsiya /nisbət elə dəyişib ki, indi qadınlar kişilərdən daha azdır*; 2. *pl* ölçü, əndazə; böyüklük; **a ship of majestic ~** nəhəng/çox böyük gəmi; 3. hissə, pay; *He hasn't done his proportion of the work O, işin ona düşən hissəsini etməyib*; **to pay one's ~ of the expenses** xərclərin özünə düşən hissəsini ödəmək; a

**large ~ of the earth's surface** yer səthinin böyük hissəsi

**proportion²** [prə'pɔ:ʃn] *v* 1. uyğunlaşdırmaq, tarazlaşdırmaq, aralarında uyğunluq yaratmaq; **to ~ *one's* expenditures to *one's* income** gəlirini çıxarı ilə uyğunlaşdırmaq/tarazlaşdırmaq; **to ~ the penalty to the nature of the crime** cinayətin xüsusiyyətinə/ xarakterinə müvafiq olaraq cəza vermək; 2. dozalamaq, dozalara bölmək *(qatışığı, qarışığı)*

**proportional** [prə'pɔ:ʃənl] *adj* proporsional; mütənasib, uyğun

**proportionality** [prə,pɔ:ʃə'nælıtı] *n* proporsionallıq; mütənasiblik, uyğunluq, tarazlıq

**proportionally** [prə'pɔ:ʃənəlı] *adv* proporsional olaraq/surətdə; **to divide *smth* ~** bir şeyi proporsional surətdə bölmək

**proportionate¹** [prə'pɔ:ʃnıt] *adj* proporsional, uyğun, mütənasib, taraz, bir əndazəli; *Increasing production costs resulted in proportionate price increases for the consumers İstehsal xərclərinin artması mütənasib olaraq istehlak qiymətlərinin artması ilə nəticələndi*

**proportionate²** [prə'pɔ:ʃneıt] *v* uyğunlaşdırmaq, tarazlaşdırmaq, bir əndazəyə salmaq; **to ~ the punishment to the crime** cəzanı cinayətə uyğunlaşdırmaq

**proportionately** [prə'pɔ:ʃnıtlı] *adv* proporsional olaraq/surətdə/tərzdə, uyğun/ müvafiq olaraq; *Costs have risen, and prices will rise proportionately Dəyərlər artıb, uyğun/ müvafiq olaraq qiymətlər də artacaq*

**proportioned** [prə'pɔ:ʃnd] *adj* proporsional, uyğun, mütənasib, müvafiq, bir əndazədə olan, taraz; *The punishment was fully proportioned to the crime Cəza tamamilə cinayətə uyğunlaşdırıldı*

**proportionless** [prə'pɔ:ʃnlıs] *adj* tənasübsüz, əndazəsiz, uyğunsuz, ölçüsüz, bir-birinə uyğun gəlməyən; qeyri-proporsional, uyğun olmayan/ gəlməyən

**proposal** [prə'pouzl] *n* 1. təklif; **alternative ~** alternativ təklif; **~ of peace** sülh təklifi; **to make/to offer a ~** təklif etmək/irəli sürmək; **to accept/to reject a ~** təklifi qəbul etmək/rədd etmək; **to withdraw a ~** təklifi geri götürmək; *Various proposals were examined and rejected Müxtəlif təkliflər müzakirə olundu və rədd edildi*; 2. təklif *(evlənmə haq.)*; *She had /had received many proposals but preferred to remain single O, evlənmək haqqında çoxlu təkliflər aldı, lakin subaylığı üstün tutdu*

**propose** [prə'pouz] *v* 1. təklif etmək/irəli sürmək; **to ~ a scheme** plan təklif etmək; **to ~ a resolution** qətnamə irəli sürmək; *The chairman proposed that the meeting should be continued the next day Sədr təklif etdi ki, iclas o biri gün davam etdirilsin*; **to ~ a toast** tost/sağlıq demək; 2. bir kəsin namizədliyini irəli sürmək/ təklif etmək; *I propose Mr. Brown for chairman Mən sədrliyə cənab Braunun namizədliyini irəli sürürəm*; 3. fikrində/ niyyətində olmaq; *We propose to leave/ leaving tonight Biz bu axşam getmək fikrindəyik*; 4. təklif etmək *(evlənmək haq.)*;

◊ *Man proposes, God disposes* ≅ *Sən saydığını say, gör Fələk nə sayır*

**proposer** [prə'pouzə^r] *n* təklif edən adam, təklif irəli sürən şəxs

**proposition** [,prɔpə'zıʃn] *n* 1. məlumat, bəyanat; *This is a proposition so clear that it needs no argument Bu məlumat o dərəcədə aydındır ki, onun heç bir sübuta ehtiyacı yoxdur*; 2. təklif; plan; *His proposition was not accepted Onun təklifi qəbul edilmədi*; 3. *d.d.* müəssisə; *It is not a paying proposition Bu, mənfəətsiz müəssisədir*; 4. *d.d.* iş, problem, məşğuliyyət; *That's an awkward proposition Bu, çətin məsələdir/işdir*; *That's a wholly different proposition! Bu, tamamilə başqa məsələdir!*; 5. *riyaz.* teorem *(sübuta ehtiyacı olan iddia)*

**propound** [prə'paund] *v* müzakirəyə təklif etmək; **to ~ a question/a plan** müzakirəyə məsələ/plan təklif etmək

**proprietary¹** [prə'praıətrı] *n* 1. sahib, sahibkar; xüsusiyyətçi, mülkiyyətçi; 2. *top.i* sahibkarlar sinfi/ zümrəsi; 3. sahiblik/ sahibkarlıq hüququ

**proprietary²** [prə'praıətrı] *adj* 1. sahibkarlıq, xüsusiyyətçilik; **~ right** sahibkarlıq/ xüsusiyyətçilik hüququ; **the ~ class** sahibkarlar sinfi; 2. özəl, xüsusi; **~ hospital** özəl xəstəxana; 3. patentli, patent almış; **~ medicine** patent almış dərman

**proprietor** [prə'praıətə^r] *n* sahibkar, sahib; **a newspaper ~** qəzet sahibi; *Please address all complaints to the proprietor Zəhmət olmasa, bütün şikayətini/şikayətinizi sahibkara ünvanla/ünvanlayın*

**proprietorial** [prə,praıə'tɔ:rıəl] *adj* sahibkarlıq, xüsusiyyətçilik; **~ rights** sahibkarlıq hüquqları; **to have a ~ air** sahibkar görkəminə malik olmaq, sahibkar görkəmi almaq

**propriety** [prə'praıətı] *n* 1. doğruluq, düzgünlük; **~ of style** üslubun düzgünlüyü; 2. **(the proprieties)** *pl* əxlaq qaydaları, əxlaqın/ davranışın düzgünlüyü; ədəb qaydalarına uyğunluq, ləyaqət, mərifət; **to observe the proprieties in all things** hər şeydə əxlaq qaydalarına riayət etmək/əxlaq qaydalarını gözləmək; **to offend the proprieties** əxlaq qaydalarına riayət etməmək/ qaydaların pozmaq;

◊ **marriage of ~** hesabla evlənmə *(yəni müəyyən səbəbi nəzərə alaraq)*

**propulsion** [prə'pʌlʃn] *n* 1. irəli hərəkət, təkan, itələmə; *The fish uses its tail pins for propulsion through the water Balıq suda irəliyə hərəkət etmək üçün quyruğundakı üzgəclərdən istifadə edir*; 2. güc qurğusu /mexanizmi; 3. hərəkətverici/sövqedici qüvvə; **unconquerable ~ to write** qarşısıalınmaz yazmaq arzusu



**propulsive** [prə'pʌlsıv] *adj* irəliyə hərəkət etdirən/təkan verən; **~ force** irəliyə təkan verən qüvvə *(raketdə)*

**propulsor** [prə'pʌlsə^r] *n* reaktiv mühərrik

**pro-rector** [,prou'rektə^r] *n* prorektor

**prorogation** [,prourə'geıʃn] *n* proroqasiya *(1) dövlət başçısının parlament sessiyasını təxirə salma hüququ); 2) dövlət başçısının göstərişilə parlamentin işində tənəffüs)*

**prorogue** [prə'roug] *v* parlamentin işində fasilə təyin etmək

**prosaic** [prə'zaıık] *adj* 1. nəsrlə yazılmış; 2. quru, cansıxıcı, bayağı; **a ~ style** cansıxıcı /quru üslub; **a ~ speaker** cansıxıcı natiq; **a ~ job** adi /cansıxıcı iş

**prosaically** [prə'zaıklı] *adv* maraqsız, cansıxıcı bir tərzdə, quru

**prosaist** [prə'zaıst] *n* prozaist, nəsr yazan

**proscribe** [prə'skraıb] *v* 1. qanundan xaric/ kənar elan etmək; qovmaq, sürgün etmək; **to ~ *smb.* from society** bir kəsi cəmiyyətdən xaric etmək/qovmaq; 2. qadağan /yasaq etmək; **to ~ dancing/ smoking** rəqsi/papiros çəkməyi qadağan etmək

**proscribed** [prə'skraıbd] *adj* qadağan/ yasaq olunmuş/ edilmiş; **~ books** qadağan/ yasaq edilmiş kitablar; **~ drugs** qadağan/ yasaq olunmuş dərmanlar

**proscription** [prəs'krıpʃn] *n* qanundan xaric edilmə, qovulma, sürgün edilmə; gözdən/ etibardan düşmə

**prose¹** [prouz] *n* 1. nəsr; **to write in ~** nəsrlə yazmaq; 2. *məc.* adi şey, gündəlik iş, maraqsız həyat; **the ~ of everyday existence** gündəlik yaşayışın adi şeyləri /işləri; 3. maraqsız/bezikdirici adam; *What a prose he is! O nə bezikdirici adamdır!*; 4. maraqsız/cansıxıcı əsər

**prose²** [prouz] *adj* 1. cansıxıcı, darıxdırıcı, usandırıcı, maraqsız; 2. nəsrlə yazılan; **a ~ writer** darıxdırıcı/ usandırıcı yazıçı

**prose³** [prouz] *v* 1. maraqsız danışmaq/ yazmaq; bir şeyi dəfələrlə təkrar etmək; 2. nəsrlə yazmaq

**prosecute** ['prɔsıkju:t] *v* 1. məşğul olmaq; **to ~ trade** ticarətlə/alverlə məşğul olmaq; 2. davam etdirmək; **to ~ war** müharibəni davam etdirmək; 3. *hüq.* məhkəmə yolu ilə təqib etmək, iş açmaq, iddia irəli sürmək; 4. ittihamçı sifətilə çıxış etmək

**prosecution** [,prɔsı'kju:ʃn] *n* 1. aparmaq; **the ~ of the inquiry** istintaq aparma; **the ~ of research problems** tədqiqat işi aparma; 2. yerinə yetirmə; **the ~ of *one's* aim** məqsədini yerinə yetirmə; 3. *hüq.* məhkəmə vasitəsilə təqib etmə; **malicious ~** məhkəmə vasitəsilə qərəzkarlıqla təqib etmə; 4. *hüq.* iddia qaldırma; 5. *amer.* dövlət ittihamı

**prosecutor** ['prɔsıkju:tə^r] *n* 1. *hüq.* ittihamçı; **Public Prosecutor** dövlət ittihamçısı, prokuror; 2. *hüq.* iddiaçı, tələb edən

**prospect¹** ['prɔspekt] *n* 1. görünüş; mənzərə, mənzərənin uzaqdan görünüşü; **a magnificent ~ of the lake** gölün valehedici mənzərəsi; 2. *adət. pl* ümid, istiqbal, prospektiv; gələcək planlar; **a ~ of success/of recovery** müvəffəqiyyətə/ sağalmağa ümid; **a man of no ~s** gələcəkdə heç bir perspektivi olmayan adam; *What are his prospects? Onun gələcək planları nədir?*; **in ~** perspektivdə, gələcəkdə; 3. nəzərdə tutulan, fərz/təxmin/güman/ehtimal edilən müştəri/namizəd; 4. *geol.* axtarış, kəşfiyyat

**prospect²** [prəs'pekt] *v* tədqiq etmək, araşdırmaq, axtarmaq; kəşfiyyat aparmaq; **to ~ for gold** qızıl axtarmaq; *The company is prospecting for gold in that area Kompaniya o ərazidə qızıl axtarır*

**prospective** [prəs'pektıv] *adj* gələcək, gözlənilən, nəzərdə tutulan; **~ advantages** gözlənilən fayda; **my ~ son-in-law** mənim gələcək kürəkənim

**prospectless** ['prɔspektlıs] *adj* perspektivsiz, gələcəyi olmayan

**prospector** [prə'spektə^r] *n geol.* kəşfiyyatçı *(qızıl və s. axtaran)*

**prospectus** [prə'spektəs] *n* prospekt *(proqram, layihə, plan)*

**prosper** ['prɔspə^r] *v* 1. müvəffəq olmaq, nailiyyət qazanmaq, irəliləmək; çiçəklənmək, tərəqqi/ inkişaf etmək; *The business prospers Müəssisə inkişaf edir/çiçəklənir*; 2. müvəffəqiyyətə kömək etmək, şərait yaratmaq; *May God prosper you Allah sənə/sizə yar olsun!*

**prosperity** [prɔs'perıtı] *n* müvəffəqiyyət, müvəffəqiyyət qazanma, çiçəklənmə, tərəqqi/ inkişaf etmə; **the ~ of an undertaking** müəssisənin tərəqqisi/inkişaf etməsi/çiçəklənməsi;

◊ *Prosperity makes friends, and adversity tries them at. söz. Firavanlıq dost yığır, fəlakət onları sınağa çəkir,* ≅ *Yaxşı dost yaman gündə tanınar/tanınır*

**prosperous** ['prɔspərəs] *adj* 1. çiçəklənən, inkişaf/tərəqqi edən; **~ nation** tərəqqi edən xalq; **~ economy** inkişaf edən/ çiçəklənən iqtisadiyyat; **~ industry** inkişaf edən sənaye; *The north of the country is still more prosperous than the south Ölkənin şimalı hələ də cənubundan daha çox inkişaf edib*; 2. zəngin, varlı, dövlətli, varlı-dövlətli; 3. müvəffəqiyyətli, uğurlu; **~ voyage** uğurlu səyahət; **to bring a plan to a ~ issue** planı müvəffəqiyyətlə həyata keçirmək/ yerinə yetirmək; 4. əlverişli, münasib; **~ weather / wind /moment** əlverişli hava/külək/an

**prostate** ['prɔsteıt] *n anat.* prostat, prostat vəzisi *(həm də ~ gland)*

**prostatitis** [ˌprɔstəˈtaɪtɪs] *n tib.* prostatit *(prostat vəzisinin iltihabı)*

**prostheses** [prɔsˈθi:si:z] *n* **prosthesis** *isminin cəm forması*

**prosthesis** [prəˈθi:sɪs] *n* **1**. *tib.* protez *(bədəndə süni hissə)*; protez qoyma; **2**. *dilç.* proteza *(sözün əvvəlinə səsartırma)*

**prosthetics** [prɔsˈθetɪks] *n tib.* protezləmə, protez qoyma, protez qayırma

**prosthetist** [ˈprɔsθɪtɪst] *n* protezçi, protez ustası/qayıran

**prostitute**[1] [ˈprɔstɪtju:t] *n* **1**. fahişə, qəhbə; **2**. *məc.* satqın, çox prinsipsiz adam

**prostitute**[2] [ˈprɔstɪtju:t] *v* **1**. fahişəlik/qəhbəlik etmək, fahişəliklə/qəhbəliklə məşğul olmaq; **2**. öz əqidəsini pula satmaq

**prostitution** [ˌprɔstɪˈtju:ʃn] *n* fahişəlik, qəhbəlik; **to earn money by/from ~** fahişəlikdən pul qazanmaq; **political ~** siyasi fahişəlik

**prostrate**[1] [ˈprɔstreɪt] *adj* **1**. sərilmiş, sərili; üzüüstə/üzüqoylu uzanan; **2**. devrilmiş, yıxılmış, çevrilmiş; tapdalanmış, ayaq altına salınmış; **3**. gücdən/ əldən salınmış, zəiflədilmiş; əldən düşmüş, yorğun, üzgün, tabsız; yorulmuş, üzülmüş; **~ with fatigue** yorğunluqdan üzülmüş/ əldən düşmüş; *The patient is quite prostrate today Xəstə bu gün tamamilə üzgündür*; **~ with grief** dərddən/ kədərdən əldən düşmüş/ üzülmüş/ yorulmuş; *She was prostrate with grief after her mother's death Anasının ölümündən sonra qəm-qüssə onu üzdü/əldən saldı*

**prostrate**[2] [prɔsˈtreɪt] *v* **1**. yıxmaq, çevirmək; *The storm prostrated hundreds of trees Tufan yüzlərlə ağacı yıxdı*; **2**.: **to ~ oneself 1**) üzüüstə/üzüqoylu yıxılmaq/ uzanmaq; **2**) alçalmaq, özünü alçaltmaq; diz çökmək; **to ~ oneself before rank and wealth** rütbə və zənginlik qarşısında alçalmaq/diz çökmək; *They prostrated themselves as a sign of worship Onlar sitayiş/səcdə əlaməti olaraq diz çökdülər*; **3**. zəiflətmək, əldən/ taqətdən/ gücdən salmaq; üzmək; *He is completely prostrated by the heat İsti onu tamamilə əldən salıb/üzüb*; **4**. qırmaq, sındırmaq; sarsıtmaq *(mənən)*; *He is prostrated by the loss of his wife Arvadının ölümü onu sarsıdıb/üzüb*

**prostration** [prɔsˈtreɪʃn] *n* **1**. sərilmiş/ yayılmış vəziyyət; **2**. itaət, itaətkarlıq, boyun əymə; təhqir olunmuş vəziyyət; **3**. yorulma, əldən düşmə, üzülmə, yorğunluq, zəiflik; ruh düşkünlüyü, üzgünlük, laqeydlik; **4**. zəifləmə, tənəzzül; **the general ~ of business after the war** müharibədən sonra biznesin/ ticarətin ümumi tənəzzülü

**prosy** [ˈprouzɪ] *adj d.d.* cansıxıcı, quru, bayağı, darıxdırıcı, usandırıcı, ürəksıxan, maraqsız; mənasız; **~ speaker** usandırıcı /darıxdırıcı natiq; **~ life** maraqsız/ ürəksıxan/darıxdırıcı həyat

**protect** [prəˈtekt] *v* müdafiə etmək; qorumaq, mühafizə etmək; **to ~ *one's* eyes from the sun** gözünü günəşdən qorumaq; **to ~ iron from erosion** dəmiri paslanmadan qorumaq; **to ~ *one's* own interests** öz maraqlarını müdafiə etmək

**protection** [prəˈtekʃn] *n* **1**. müdafiə, mühafizə; müdafiə/mühafizə etmə; qoruma; qorunma; **the ~ of the country against her enemies** ölkəni onun düşmənlərindən müdafiə etmək/ qorumaq; **labour ~** əməyin mühafizəsi; **~ of game** ovun qadağan/ yasaq edilməsi; **2**. himayə, hamilik, himayəçilik, havadarlıq; **to extend *one's* ~ to a young author** gənc yazıçıya hamilik/ himayədarlıq etmək

**protective** [prəˈtektɪv] *adj* qoruyucu; **~ armour /clothing /dressing** qoruyucu zireh/ geyim/ sarğı; **~ vaccination** *tib.* qoruyucu peyvənd/peyvənd etmə; **~ spectacles/ glasses** qoruyucu eynək; **~ mask** *hərb.* əleyhqaz; **~ measures** qoruyucu tədbirlər; **~ belt** *k.t.* qoruyucu zolaq

**protector** [prəˈtektə(r)] *n* **1**. müdafiəçi, qoruyucu, qoruyan; müdafiə/ mühafizə edən; **2**. havadar, himayə edən, himayəçi, hami

**protectorship** [prəˈtektəʃɪp] *n* **1**. protektorat *(müstəmləkə xalqlarını əsarətdə saxlama üsullarından biri)*; **2**. himayə, havadarlıq, hamilik, himayəçilik

**protectory** [prəˈtektərɪ] *n* sahibsiz və həddibüluğa çatmamış cinayətkar uşaqlar üçün müəssisə

**protectress** [prəˈtektrɪs] *n* **1**. müdafiə edən qadın/qız, müdafiəçi qadın/qız; **2**. himayəçi qadın/qız, patronessa *(xeyriyyəçi qadın)*

**protest**[1] [ˈproutest] *n* **1**. protest, qəti etiraz; **to make a ~** protest/qəti etiraz etmək; **2**. protest/etiraz/şikayət etmə, şikayət vermə

**protest**[2] [prəˈtest] *v* **1**. protest/qəti etiraz/ narazılıq etmək, şikayətlənmək, əleyhinə çıxmaq/olmaq; **to ~ against a proposal** təklifə qarşı qəti etiraz etmək; **2**. təntənəli tərzdə elan etmək; *I protest that I am innocent Mən elan edirəm ki, mən günahsızam*

**Protestant**[1] [ˈprɔtɪstənt] *n din.* protestant *(protestant məzhəbinə mənsub olan adam)*

**Protestant**[2] [ˈprɔtɪstənt] *adj* protestant; **a Protestant church** Protestant kilsəsi

**Protestantism** [ˈprɔtɪstəntɪzm] *n din.* protestantizm, protestantlıq *(katolisizmdən ayrılmış xristian məzhəblərinin ümumi adı)*

**protestation** [ˌproutesˈteɪʃn] *n* **1**. təntənəli surətdə elan etmə; **a ~ of loyalty/of innocence** sadiq/günahsız olması haqqında təntənəli surətdə elan etmə; **2**. protest/ etiraz/şikayət etmə

**protester** [prəˈtestə(r)] *n* protest/qəti etiraz edən adam; *Test protesters call on Premier today Nüvə silahının sınağına qəti etiraz edənlər bu gün baş nazirlə görüşəcəklər*

**protocol**[1] [ˈproutəkɔl] *n* **1**. protokol; **to draw up a ~** protokol yazmaq/tərtib etmək; **2**. etiket, mərasim; cəmiyyətdə davranma qaydaları; **diplomatic ~** diplomatik etiket



**protocol**[2] [ˈproutəkɔl] *v* protokol yazmaq /tərtib etmək, protokola daxil etmək

**proton** [ˈproutɔn] *n fiz.* proton *(müsbət yüklü zərrəcik)*

**protoplasm** [ˈproutəplæzm] *n biol.* protoplazma *(heyvan və bitki orqanizmi hüceyrəsinin əsasını təşkil edən maddə)*

**prototype** [ˈproutətaɪp] *n* prototip *(misal, ilk nümunə)*

**protract** [prəˈtrækt] *v* **1**. uzatmaq, ləngitmək, gecikdirmək, yubatmaq, süründürmək; **to ~ negotiations** danışıqları yubatmaq/ləngitmək; **2**. çəkmək, cızmaq *(plan)*; **3**. çəkib uzatmaq

**protracted** [prəˈtræktɪd] *adj* uzadılmış; uzun, uzunçəkən, uzunsürən; **~ negotiations** uzunçəkən/uzun danışıqlar; **~ war** uzunçəkən/uzunsürən müharibə; **~ defence** *hərb.* uzun/uzunsürən mühasirə

**protraction** [prəˈtrækʃn] *n* **1**. ləngitmə, yubatma, gecikdirmə, uzatma; ləngimə, yubanma; **the ~ of a debate** müzakirənin/ mübahisənin uzadılması; **2**. plana salma/ daxil etmə; plan, çertyoj

**protractor** [prəˈtræktə(r)] *n* transportir *(bücaqölçən cizgi aləti)*

**protrude** [prəˈtru:d] *v* **1**. çıxartmaq; **to ~ *one's* tongue** dilini çıxartmaq; **2**. çıxmaq, dik durmaq; dombalmaq; *His eyes protruded Onun gözləri dombalmışdı*; **3**. zorla boynuna qoymaq/qəbul etdirmək, vadar etmək

**protruding** [prəˈtru:dɪŋ] *adj* **1**. irəli/qabağa çıxan; dombalan; sallaq; **~ lips** sallaq dodaqlar; **~ forehead/ eyes** dombalan alın/gözlər; **~ belly** irəli/qabağa çıxmış qarın; **2**. çıxarılmış *(çölə)*; **~ tongue** çıxarılmış dil *(çölə)*

**protrusion** [prəˈtru:ʒn] *n* **1**. qabağa vermə, qabartma, gərmə; **~ of the eyeballs** göz almacığını qabartma /dombaltma; **2**. çıxıntı; **a roof with many ~s** çoxlu çıxıntıları olan dam; **rocky ~s on the surface of the cliff** qayanın səthində daş çıxıntılar

**protuberance** [prəˈtju:bərəns] *n* **1**. qabarıqlıq; qabarıq yer, çıxıntı; **2**. *anat.* şiş, qabarıq, çıxıntı; **a ~ on his forehead** onun alnında şiş; **3**. *tib.* şiş; **cancerous ~** xərçəng şişi

**protuberant** [prəˈtju:bərənt] *adj* **1**. qabağa/irəli çıxmış; dombalan; **~ eyes** dombalan gözlər; **2**. nəzərə çarpan, irəli çıxan; **~ ears** nəzərə çarpan/irəli çıxan qulaqlar

**proud**[1] [praud] *adj* **(-er, -est) 1**. məğrur, vüqarlı; şəxsi ləyaqəti olan; məmnunluq/razılıq hissi keçirən, qürurlu; **a ~ father/mother** məğrur ata/ana; *They are poor but proud Onlar kasıb, lakin məğrurdurlar*; **to be ~ of** fəxr etmək, öyünmək; **to be ~ of *one's* country** vətəni ilə fəxr etmək/öyünmək; **2**. lovğa, dikbaş, təkəbbürlü, iddialı; özündən razı, özünü bəyənən, öz nöqsanını görməyən; **~ look** təkəbbürlü /lovğa/iddialı baxış; **(as) ~ as a peacock** tovuz (quşu) kimi təkəbbürlü; **3**. əzəmətli, dəbdəbəli, təmtəraqlı, çox gözəl; **one of the ~est cities of the ancient world** qədim dünyanın əzəmətli/ən gözəl şəhərlərindən biri; **4**. şişmiş, köpmüş

**proud**[2] [praud] *adv* vüqarla, əzəmətlə, məğrurcasına; *The statue stands tall and proud in the main square Heykəl baş meydanda vüqarla/əzəmətlə ucalır*

**proudly** [ˈpraudlɪ] *adv* iftixarla, vüqarla, qürurla, məğrur-məğrur; təkəbbürlü, lovğa-lovğa; *She proudly displayed her prize O, prizini iftixarla nümayiş etdirdi*

**prove** [pru:v] *v* **1**. sübut etmək; **to ~ *smb.'s* guilt/ innocence** bir kəsin günahını/ günahsızlığını sübut etmək; *It remains to be proved Bunu hələ sübut etmək lazımdır*; **2**. təsdiqləmək, təsdiq etmək, inandırmaq; **to ~ *one's* identity** şəxsiyyətini təsdiq etmək; **to ~ a will** vəsiyyətnaməni təsdiqləmək/təsdiq etmək; **3**. sınamaq, yoxlamaq, sınaqdan keçirmək; **to ~ *smb.'s* honesty** bir kəsin düzlüyünü/ sədaqətini/ səmimiyyətini sınamaq; **to ~ a new weapon** yeni/təzə silahı təcrübədən /sınaqdan keçirmək; **4**. aşkar olmaq, meydana çıxmaq, məlum olmaq; *The report proved false Məlumatın yalan olduğu aşkar/məlum oldu*; **5**. *poliqr.* sınaq ottiski almaq

**proveable** [ˈpru:vəbl] *adj* sübut oluna bilən; **a ~ fact** sübut oluna bilən fakt/sübut/dəlil

**proveableness** [ˈpru:vəblnɪs] *n* sübut oluna bilmə, sübut olunma imkanı

**proven** [ˈpru:vn] *adj* sübut edilmiş/olunmuş; **a man of ~ ability** bacarığı/qabiliyyəti sübut edilmiş adam

**provenance** [ˈprɔvənəns] *n* qaynaq, əsl mənbə/mənşə; **the ~ of a word/of a language** sözün/dilin mənşəyi

**proverb** [ˈprɔvə:b] *n* atalar sözü; zərb-məsəl

**proverbial** [prəˈvə:bjəl] *adj* **1**. atalar sözünə/ zərb-məsələ aid olan; **~ style** atalar sözlərinə/ zərb-məsəllərə aid üslub; **~ wisdom** atalar sözlərinin/ zərb-məsəllərin müdrikliyi; **2**. atalar sözünə/zərb-məsələ çevrilmiş; hamıya məlum (olan), məşhur; **the ~ London fog** məşhur London dumanı; *His meanness was proverbial Onun xəsisliyi dillərdə dastan idi*

**proverbially** [prəˈvə:bɪəlɪ] *adv* hamıya məlum; *He is proverbially stupid Onun axmaqlığı hamıya məlumdur /dillərdə dastandır*

**provide** [prəˈvaɪd] *v* **1**. **(with)** təmin/təchiz etmək; vermək; **to ~ *smb.* with money** bir kəsi pulla təmin etmək; **to ~ a child with a good education** uşağa yaxşı təhsil vermək; **to ~ a car with a radio** maşını radio ilə təchiz etmək; **2**. ehtiyat yığmaq; **to ~ against a rainy day** qa-

ra gün üçün ehtiyat yığmaq; 3. vermək; göstərmək *(yardım)*; **to ~ meals** yemək vermək; **to ~ military aid for friendly countries** dost ölkələrə hərbi yardım göstərmək/vermək; **to ~ an opportunity for** *smb.* **to do** *smth.* bir iş görmək üçün bir kəsə imkan vermək/ yaratmaq; 4. **(against, for)** ölçü götürmək, tədbir görmək; hazır olmaq; **to ~ against a surprise attack** qəfil hücumun qarşısını almaq üçün tədbir görmək/hazır olmaq; 5. *hüq.* nəzərdə tutmaq; *The contract provides for payment in cash Müqavilə ödənişi nağd pulla ödəməyi nəzərdə tutur*; 6. *hüq.* **(against)** qadağan/ yasaq etmək; *This contract provides against the resale of the goods Bu müqavilə malı alıb-satmağı qadağan edir*

**provided** [prə'vaɪdɪd] *conj (həm də* **providing that**) əgər; bu şərtlə (ki); *I shall give you my dictionary provided that you return it tomorrow Mən lüğətimi sənə/ sizə bu şərtlə verərəm ki, onu sabah qaytarasan/ qaytarasınız; I will agree to go provided/ providing (that) my expenses are paid Mən getməyə razılaşıram, bu şərtlə ki, mənim xərclərim ödənsin*

**providence** ['prɔvɪdəns] *n* 1. ehtiyat, ehtiyatlılıq, tədbirlilik, ehtiyatkarlıq; 2. *din.* ilahi qüvvə; qəzavü-qədər, tale; 3. *amer.* fəlakət, bədbəxtlik

**provident** ['prɔvɪdənt] *adj* 1. ehtiyatlı, tədbirli, ehtiyatkar, işinin dalını-qabağını düşünən; *Squirrels are provident Dələlər ehtiyatlıdırlar*; 2. qənaətcil, qənaətkar; *He is provident of money O, pulu qənaətlə xərcləyir*

**provider** [prə'vaɪdəʳ] *n d.d.* ailəni dolandıran, ailə başçısı; *The eldest son is the family's only provider Ailəni ancaq/təkcə böyük oğul dolandırır*

**providing** [prə'vaɪdɪŋ] *conj* = **provided**

**province** ['prɔvɪns] *n* 1. vilayət, əyalət; 2. sahə *(elmdə və s.)*; **the ~ of philology** filologiya sahəsi

**provincial¹** [prə'vɪnʃl] *n* əyalət/rayon adamı, geridəqalmış adam, avam

**provincial²** [prə'vɪnʃl] *adj* 1. əyalət; **~ government** əyalət hökuməti; **~ newspapers, theatres/ towns/ bank** əyalət qəzetləri/ teatrları/ şəhərləri/ bankı; 2. yerli; **~ accent** yerli şivə/ danışıq tərzi

**provincialism** [prə'vɪnʃəlɪzm] *n* 1. gerilik, sadəlik, avamlıq, kobudluq; 2. provinsializm *(1) əyalətə məxsus görüş və ədalar; 2) məc. məhəlli söz və ya ifadə)*

**provincialist** [prə'vɪnʃəlɪst] *n* provinsial *(rayon/əyalət adamı)*, əyalət sakini, əyalətdə yaşayan adam

**provision¹** [prə'vɪʒn] *n* 1. təchiz etmə/ edilmə, təmin etmə/edilmə; təchizat; **to make ~ for the future** gələcəyini təmin etmək; **the ~ of necessaries** gündəlik tələbat malları ilə təchiz/təmin etmə; 2. ehtiyat, tədarük; ehtiyat görmə, tədarük etmə; **to make ~ for a journey** səyahət üçün ehtiyat görmək/ tədarük etmək; 3. *pl* azuqə, ərzaq; ərzaq ehtiyatı/malları; *Provisions are plentiful Ərzaq ehtiyatı boldur*; 4. **(against)** ehtiyat tədbiri; **to make ~ against attack by air** hava hücumuna qarşı tədbir görmək; 5. müddəa, şərt *(saziş, qanun və s. haq.)*; qərar, qətnamə; **treaty ~s** müqavilə müddəaları / şərtləri

**provision²** [prə'vɪʒn] *v* azuqə ilə/ərzaqla təmin etmək

**provisional** [prə'vɪʒənl] *adj* 1. müvəqqəti; **a ~ government** müvəqqəti hökumət; **a ~ capital of a country** ölkənin müvəqqəti paytaxtı; **~ arrangements** müvəqqəti tədbirlər; **~ allowance** müvəqqəti maaş/ məvacib; **~ filling** müvəqqəti plomb *(dişə qoyulan)*; 2. ilk, ilkin; qabaqcadan /əvvəlcədən olan; **~ diagnosis** ilkin diaqnoz; **~ edition** ilk/ilkin nəşr

**provisionally** [prə'vɪʒnəlɪ] *adv* müvəqqəti, müvəqqəti olaraq; hələlik; şərti, şərti olaraq; **to sign an agreement ~** müqaviləni şərti olaraq imzalamaq; *The meeting has been provisionally arranged for 3.00 pm next Saturday İclas şərti olaraq gələn şənbə saat 15-ə təyin edilmişdi*

**provisioner** [prə'vɪʒnəʳ] *n* tədarükçü, təchiz edən, mal göndərən

**proviso** [prə'vaɪzou] *n (pl* **-oes, -os** [-ouz]) şərt, klauzula *(müqavilədə ayrıca maddə/şərt və ya qeyd)*; *With (a) proviso that... Bu şərtlə ki,...; I agreed to go, with the proviso that my family should come with me Mən getməyə bu şərtlə razılaşdım ki, ailəm də mənimlə getsin*

**provocation** [ˌprɔvə'keɪʃn] *n* 1. meyl, səbəb; çağırış, meydan oxuma; təhrikçilik, qızışdırıcılıq; *He gets angry on/at the slightest provocation O ən cüzi bir səbəbdən hirslənir/ qəzəblənir/ qızışır*; 2. provokasiya, təhrik, fitnə, fitnəkarlıq, ara qarışdırma; **acts of ~** fitnəkarlıq hərəkətləri; 3. acıqlanma, acıqlandırma; qıcıqlanma, qıcıqlandırma; əsəbiləşmə, əsəbiləşdirmə; *I think I have reasonable grounds for feeling provocation Mənə elə gəlir ki, mənim əsəbiləşməm üçün ciddi səbəblər var*

**provocative** [prə'vɔkətɪv] *adj* 1. səbəb/bais olan; ədəbsiz, həyasız; **~ laughter** ədəbsiz gülüş; **~ behaviour** ədəbsiz/ həyasız davranış/əxlaq; 2. doğuran, oyadan, təhrik/vadar edən, səbəb/bais olan; **~ of sorrow/of curiosity** qüssə/maraq doğuran; 3. əsəbiləşdirici, acıqlandırıcı, əsəbiləşdirməyə səbəb olan; **a ~ remark/speech** əsəbiləşdirici irad/ nitq

**provocatively** [prə'vɔkətɪvlɪ] *adv* əsəbiləşdirici/ əsəbə toxunacaq tərzdə, fitnəkarcasına, fitnə törədəcək bir tərzdə

**provoke** [prə'vouk] *v* 1. səbəb/bais olmaq, törətmək, oyatmaq, doğurmaq; **to ~ laughter/ anger/ doubt/ indignation** gülüş/ acıq/ şübhə/ hiddət doğurmaq; 2. provokasiyaya təhrik/sövq etmək, törətmək, səbəb olmaq; **to ~ a riot** qiyam törətmək; *He did his best to provoke an argument O, əlindən gələni etdi ki, mübahisə törətsin/yaratsın*; 3. acıqlandırmaq, əsəbiləşdirmək, hirsləndirmək, qəzəbləndirmək, qızışdırmaq; *If you provoke the dog, it will attack you Əgər sən/siz iti acıqlandırsan/acıqlandırsanız, o sənə/sizə hücum edəcək*; 4. vadar/ məcbur/ təhrik etmək; həvəs oyatmaq; *He was at last provoked to read some poetry Nəhayət onda bir neçə şer oxumağa həvəs yaratdılar*

**provoking** [prə'voukɪŋ] *adj* əsəbiləşdirici, əsəbiləşdirən; qıcıqlandırıcı; təəssüflü, təəssüfələyiq, təəssüf ediləcək, peşmançılıq törədən; nifrət oyadan, xoşagəlməz, iyrənc, çirkin, pis; **~ behaviour** əsəbiləşdirən hərəkət/ davranış; **~ noises** əsəbiləşdirici/ qıcıqlandırıcı səslər; *How provoking you are! Sən/Siz necə də əsəblərə toxunursan!/ toxunursunuz!*

**provost** ['prɔvəst] *n* 1. rektor *(bəzi ingilis kolleclərində, universitetlərində)*; 2. prorektor *(amerikan universitetlərində)*

**prow** [prau] *n* burun *(gəmidə, təyyarədə)*

**prowess** ['prauɪs] *n* 1. şücaət, qəhrəmanlıq, igidlik, mərdlik, fədakarlıq; 2. ustalıq, mükəmməllik, kamillik; **the politician's ~ in debate** dövlət xadiminin mübahisə/ müzakirə aparmaq ustalığı; **sporting ~** idman ustalığı

**prowl¹** [praul] *n* çapovulçu, soyğunçu, talançı, qarətkar;

◊ **to have a ~ for** gəzmək, dolaşmaq; *I'm going for a prowl round the bookshops to see what I can find Mən istəyirəm kitab mağazalarını gəzim, görüm nə tapıram*

**prowl²** [praul] *v* 1. vurnuxmaq, dolaşmaq, gəzişmək, özünü ora-bura vurmaq *(bir şey axtararkən)*; gizlincə/xəlvətcə yaxınlaşmaq *(adət. vəhşi heyvanlar haq.)*; *Wolves prowl the forest Canavarlar meşədə vurnuxur; I heard him prowling about in his bedroom all night Mən bütün gecəni onun yataq otağında vurnuxduğunu eşitdim; She likes to prowl round the shops O, mağazalarda dolaşmağı sevir*; 2. çapovulçuluq/ soyğunçuluq etmək; 3. *amer. d.d.* axtarmaq *(adamın üst-başını)*; əli ilə yoxlamaq, əlləyib yoxlamaq; *The policeman prowled me over carefully with his left hand Polis nəfəri sol əli ilə mənim hər yerimi əlləyib diqqətlə yoxladı*

**prowler** ['prauləʳ] *n* dolaşan/vurnuxan *(adam və s.)*

**prowling** ['praulɪŋ] *adj* gəzən, dolaşan, vurnuxan; **dogs ~ about at night** gecə ətrafda dolaşan/vurnuxan itlər; **thieves ~ about the streets at night** gecə küçələrdə dolaşan/gəzən/vurnuxan oğrular

**proximate** ['prɔksɪmət] *adj* 1. ən yaxın; bilavasitə; **~ cause** bilavasitə səbəb; **~ successor** ən yaxın/bilavasitə varis; **on Sunday ~** gələn bazar; **~ house** ən yaxın/ qonşu ev; 2. təxmini; **~ analysis** təxmini analiz

**proximity** [prɔk'sɪmɪtɪ] *n* yaxınlıq, qonşuluq; **in the ~ to the station** vağzalın yaxınlığında/ qonşuluğunda; **~ of blood** qan qohumluğu

**proxy** ['prɔksɪ] *n* ixtiyar, səlahiyyət, vəkalət, hüquq; etibarnamə, vəkalətnamə; vəkalət/ səsini vermə; **by ~** vəkalətlə, etibarnamə ilə; **to appear by ~** vəkalətlə çıxış etmək; **to vote by ~** etibarnamə vasitəsilə səs vermək; **to stand/to be ~ for** bir kəsin nümayəndəsi/ müvəkkili/təmsilçisi olmaq

**prude** [pru:d] *n* 1. təvazökar qadın/qız; 2. riyakar, ikiüzlü

**prudence** ['pru:dns] *adj* 1. ağıl, kamal, ağıllılıq, düşüncəlilik, dərrakə, idrak; 2. ehtiyatlılıq, ehtiyat, tədbirlilik; 3. qənaətcillik, qənaətkarlıq, yığıcılıq, yığımcıllıq

**prudent** ['pru:dnt] *adj* 1. ağıllı, kamallı, düşüncəli, fərasətli, dərrakəli, mühakiməli; 2. ehtiyatlı, ehmallı, üsullu; 3. qənaətcil; **a ~ house-keeper** qənaətcil evdar qadın; **the ~ use of resources** ehtiyatların qənaətlə istifadəsi

**prudently** ['pru:dentlɪ] *adv* ağılla, ehtiyatla; qənaətcilliklə; **to act ~ in a crisis** böhran zamanı qənaətcilliklə hərəkət etmək

**prune¹** [pru:n] *n* 1. qurudulmuş qara gavalı; 2. *d.d.* gic, axmaq, sarsaq, avam

**prune²** [pru:n] *v* 1. kəsmək, kəsib gödəltmək; budamaq *(ağacı)*; 2. qısaltmaq, azaltmaq *(xərci və s.)*; **to ~ appropriations** pul buraxmanı azaltmaq; **to ~ away costs** xərci azaltmaq

**pruned** [pru:nd] *adj amer. d.d.* sərxoş, kefli, məst

**pruning** ['pru:nɪŋ] *n* 1. kəsmə, budama *(ağacı)*; 2. qısaltma, qısaldılma, ixtisar, ixtisar etmə; azaltma, azaldılma, kiçiltmə *(nitqi, kitabı və s.)*; *My article could do with a bit of pruning Mənim məqaləm bir az qısaldıla bilər*

**pruning-knife** ['pru:nɪŋ'naɪf] *n (pl* **-knives** [-'naɪvz]) *bağç.* calaq/budama bıçağı

**pruning scissors** ['pru:nɪŋ'sɪzəz] *n bağç.* bağ/ bağban qayçısı

**prurience** ['pruərɪəns] *n* 1. şiddətli arzu/ həvəs; öhdəsindən gəlmək mümkün olmayan/ qarşısı alınmaz arzu; 2. şəhvət, ehtiras, şəhvətpərəstlik

**prurient** ['pruərɪənt] *adj* şəhvətli, ehtiraslı, şəhvətpərəst, həvəsli

**pry** [praɪ] *v* I *(pt, pp* **pried** [praɪd]) qarışmaq, burnunu başqasının işinə soxmaq; *I don't want them prying into my affairs Mən istəmirəm ki, onlar mənim işimə qarışsınlar*

**pry** [praɪ] *v* II *(pt, pp* **pried** [praɪd]) 1. tərpətmək, güclə açmaq; **to ~ the lid of a can** bankanın qapağını güclə açmaq; **to ~ the door open** qapını sındırıb/qırıb açmaq; 2. güclə/zorla almaq; **to ~ military information out of a prisoner** əsirdən zorla hərbi sirri öyrənmək/almaq

**PS** ['pi:'es] *n* **postscriptum** *sözünün qısa forması*

**psalm¹** [sa:m] *n din.* zəbur surəsi

**psalm²** [sa:m] *v* zəbur surəsi oxumaq

**pseudo¹** ['sju:dou] *adj arx.* yalançı, saxta, süni, qondarma

**pseudo-$^{2}$** ['sju:dou-] *mürəkkəb sözlərin əvvəlində işlənərək* **yalançı, saxta** *mənası ifadə edən hissəcik*; **pseudo**science **yalançı** elm; *John considers that the study of the stars as an influence on man's fate is only a pseudoscience Con hesab edir ki, ulduzların insan taleyinə təsir etməsini öyrənmək yalançı elmdir*
**pseudonym** ['sju:dənım] *n* təxəllüs
**psych** [saık] *n* 1. psixologiya; 2. psixologiya kursu
**psychiatrist** [saı'kaıətrıst] *n* psixiatr *(ruhi xəstəliklər həkimi)*
**psychiatry** [saı'kaıətrı] *n* psixiatriya *(ruhi xəstələrdən və onların müalicə üsullarından bəhs edən elm)*
**psychoanalyse** [saıkou'ænəlaız] *v* psixoanaliz etmək
**psychoanalysis** [saıkouə'næləsıs] *n* psixoanaliz
**psychological** [,saıkə'lɒdʒıkl] *adj* psixoloji; ~ **research** psixoloji/psixologiya sahəsində tədqiqat; ~ **moment** psixoloji an; ~ **warfare** *hərb.* psixoloji müharibə; **the ~ development of a child** uşağın psixoloji inkişafı
**psychologically** [,saıkə'lɒdʒıklı] *adv* psixoloji baxımdan /cəhətdən; **to be ~ healthy** psixoloji cəhətdən sağlam olmaq
**psychologism** [saı'kɒlədʒızm] *n fəls.* psixologizm *(subyektiv psixologiyanı bütün fəlsəfənin əsası hesab edən idealist cərəyan)*
**psychologist** [saı'kɒlədʒıst] *n* psixoloq
**psychology** [saı'kɒlədʒı] *n* psixologiya; **child ~** uşaq psixologiyası; **the ~ of the teenagers** yeniyetmələrin psixologiyası
**psychopath** ['saıkəpæθ] *n* psixopat, dəli
**psychopathy** [saı'kɒpəθı] *n* 1. psixopatiya *(ruhi fəaliyyətin pozulması, ruhi xəstəlik, dəlilik)*; 2. hipnozla /təlqinlə müalicə
**psychoses** [saı'kousi:z] **psychosis** *isminin cəm forması*
**psychosis** [saı'kousıs] *n (pl* **-ses**) psixoz *(ruhi xəstəlik, dəlilik)*, əsəb pozğunluğu; **war ~** hərbi psixoz
**psychotherapy** ['saıkou'θerəpı] *n tib.* psixoterapiya *(psixi təsirlə müalicə)*
**pub** [pʌb] *n d.d.* 1. pivəxana, bar, qəlyanaltı; 2. aşxana, yeməkxana, aşxanası olan mehmanxana
**puberal** ['pju:bərəl] *adj* yetişmiş, həddi-büluğa çatmış, yetkin *(oğlan, qız)*, cinsi əlaqəyə girə bilmək həddinə çatmış
**puberty** ['pju:bətı] *n* həddi-büluğa çatma, yetkinlik, cinsi yetkinlik; **age of ~** yetkinlik/ həddi-büluq yaşı; həddi-büluq yaşına çatma; **to reach the age of ~** həddi-büluğa çatmaq, yetkinləşmək *(oğlan, qız haq.)*
**pubescence** [pju:'besns] *n* 1. cinsi yetişmə, həddi-büluğa çatma, cinsi yetkinlik; 2. *anat.* qasıq qılı; 3. *bot.* tük *(bəzi meyvələrdə)*
**pubescent$^{1}$** [pju:'besnt] *n* cinsi əlaqə həddinə/ yaşına çatmış cavan oğlan
**pubescent$^{2}$** [pju:'besnt] *adj* 1. həddi-büluğa çatmış; 2. qasığı qıllanmış/ tüklənmiş; 3. *bot.* tüklə örtülü/ örtülmüş *(meyvə haq.)*
**pubic$^{1}$** ['pju:bık] *n anat.* qasıq
**pubic$^{2}$** ['pju:bık] *adj* qasıq; **~ hair** qasıq qılı; **the ~ bone** qasıq sümüyü
**pubis** ['pju:bıs] *n (pl* **-bes**) *anat.* qasıq sümüyü
**public$^{1}$** ['pʌblık] *n* 1. *top.i* xalq, camaat, el, adamlar; *The public is the best judge, The public are the best judges Xalq ən yaxşı hakimdir*, ≅ *Xalqın gözü tərəzidir*; 2. ictimaiyyət, kütlə; tamaşaçılar; **the reading ~** oxucu kütləsi; **theatrical ~** teatr tamaşaçıları; *The public are not admitted Giriş qadağandır*; **general ~, ~ at large** geniş kütlə; **in ~** açıq, camaat/kütlə qarşısında; *She was appearing in public for the first time since her illness Xəstələndikdən sonra o, ilk dəfə idi ki, camaat qarşısına çıxdı*; **to apply to the ~** ictimaiyyətə müraciət etmək
**public$^{2}$** ['pʌblık] *adj* 1. ictimai; **~ opinion** ictimai fikir/rəy; **~ spirit** ictimai şüur; **~ figure** ictimai xadim; **~ order** ictimai asayiş; **~ nuisance** 1) ictimai asayişin pozulması; 2) ictimai asayişi pozan; **for ~ use** elliklə/ ümumi istifadə üçün; 2. xalq, ümumxalq; **~ ownership** ümumxalq əmlakı/ malı, ümumxalq mülkiyyəti; 3. kollektiv, ellik; kommunal, şəhər təsərrüfatına aid olan; **~ service** kommunal xidmət; 4. kütləvi, ümumi; **~ lecture** kütləvi mühazirə; **~ library** ümumi kitabxana; 5. açıq; **~ meeting** açıq iclas; **~ protest** açıq protest/etiraz; **to make ~** açmaq, açıb demək/söyləmək; 6. dövlət, milli; **~ domain** dövlət mülkiyyəti; **~ lands** dövlət torpaqları; **~ debt/loan** dövlət borcu/istiqrazı; **~ revenue** dövlət gəliri; **~ office** 1) dövlət idarəsi; 2) dövlət vəzifəsi; **~ law** dövlət hüququ; **~ notary, notary ~** notarius;
◊ **to be in the ~ line** bar/aşxana sahibi olmaq
**publican** ['pʌblıkən] *n* bar/aşxana sahibi
**publication$^{1}$** [,pʌblı'keıʃn] *n* 1. nəşr/dərc etmə, nəşr/dərc edilmə; **the ~ of a report** hesabatın dərc edilməsi; 2. nəşr, çap; **to read a book on first ~** kitabı ilk/birinci nəşrində oxumaq; 3. əsər; 4. elan etmə; **~ of the exam results** imtahanın nəticələrini elan etmə
**publication$^{2}$** [,pʌblı'keıʃn] *adj* nəşr, çap; **~ date** nəşr tarixi, nəşrin satışa buraxılma tarixi
**public health** ['pʌblık'helθ] *n* səhiyyə
**public house** [,pʌblık'haus] *n* = **pub**
**publicist** ['pʌblısıst] *n* publisist, jurnalist
**publicity** [pʌb'lısıtı] *n* 1. açıqlıq, aşkarlıq; **to give ~ to *smth.*** bir şeyi aşkarlamaq; 2. məşhurluq, şöhrət, ad, şan; 3. reklam, reklam vermə/ etmə
**publicize** ['pʌblısaız] *v* 1. aşkarlamaq, açıb demək/ söyləmək; 2. reklam vermək; 3. xəbər vermək, bildirmək



**publicly** ['pʌblıklı] *adv* açıq, aşkar, camaat qarşısında
**publish** ['pʌblıʃ] *v* 1. nəşr etmək; **to ~ a book** kitab nəşr etmək; *This book was published last year Bu kitab keçən il nəşr edildi/edilib; This journal is published monthly Bu jurnal ayda bir dəfə nəşr edilir/olunur*; 2. öz əsərini nəşr etdirmək; *She has just published her first novel O özünün birinci romanını yenicə nəşr etdirib*; 3. elan/bəyan etmək, bildirmək; **to ~ an edict** fərmanı elan/bəyan etmək; **to ~ notice of a death/of a marriage** ölüm/evlənmə haqqında məlumat nəşr etmək; 4. *amer.* dövriyyəyə buraxmaq; **to ~ counterfeit paper** dövriyyəyə saxta banknot buraxmaq
**publisher** ['pʌblıʃəʳ] *n* naşir, nəşr/çap edən; **~'s rights** naşir hüquqları
**publishing$^{1}$** ['pʌblıʃıŋ] *n* nəşriyyat işi; *She was offered a job in publishing Ona nəşriyyatda bir iş təklif etdilər*
**publishing$^{2}$** ['pʌblıʃıŋ] *adj* nəşriyyat; **~ industry** nəşriyyat sənayesi; **~ house/office/ firm** nəşriyyat; **~ market** kitab bazarı
**puce$^{1}$** [pju:s] *n* qırmızımtıl-palıdı rəng
**puce$^{2}$** [pju:s] *adj* qırmızımtıl-palıdı; *The man's face was puce with rage Qəzəbdən kişinin sifəti qırmızımtıl-palıdı rəng aldı*
**puck** [pʌk] *n id.* şayba *(hokkey oyununda)*
**pucker$^{1}$** ['pʌkəʳ] *n* 1. qırış; bürüşük; qırçın, qat; 2. *d.d.* həyəcan, utanma, karıxma, üz-gözünü turşutma/ büzüşdürmə
**pucker$^{2}$** ['pʌkəʳ] *v* 1. büzmək, qırışdırmaq, büzüşdürmək, qırış-qırış/büzüş-büzüş etmək; *If you pucker up your lips like that, you'll get lines round your mouth Əgər sən/siz dodaqlarını/ dodaqlarınızı belə büzüşdürsən/ büzüşdürsəniz, ağzının/ ağzınızın kənarında qırışlar əmələ gələcək*; *(həm də* **to ~ up**); **to ~ *one's* brows** qaşlarını çatmaq; **to ~ *one's* lips** dodaqlarını büzmək; 2. büzülmək; üz-gözünü turşutmaq, ağız-burnunu büzmək; *The child's face puckered (up) and he began to cry Uşaq ağız-burnunu büzdü və sonra ağlamağa başladı*
**puckered** ['pʌkəd] *adj* 1. qırışmış, qırış-qırış olmuş, qırışlarla örtülmüş; büzüşmüş, büzüş-büzüş olmuş; **face all ~ up** qırış-qırış olmuş/ qırışmış sifət; **~ skin** qırışmış dəri; 2. büzməli, büzmələnmiş *(parça haq.)*
**puckery** ['pʌkərı] *adj* 1. büzülmüş, qırışmış, qırışıqlı; 2. büzüşdürücü, büzücü *(ağızı)*
**puckish** ['pʌkıʃ] *adj* 1. nadinc, dəcəl, şeytan, oynaq, şux; 2. acıqlı, hirsli, qəzəbli, qeyzli
**puckster** ['pʌkstəʳ] *n d.d.* hokkeyçi, hokkey oyunçusu/oynayan
**pudding** ['pudıŋ] *n* pudinq *(un və ya düyüdən, yumurta və süddən hazırlanmış kükü)*; zapekanka *(xörək adı)*
**puddle** ['pʌdl] *n* gölməçə, nohur *(xüs. yağışdan əmələ gəlmiş)*;
◊ **to be in a pretty ~** çətin/çıxılmaz vəziyyətdə olmaq, biabır/rüsvay olmaq
**puddled** ['pʌdld] *adj* 1. bulanıq, bulanıqlaşdırılmış *(su haq.)*; **~ streams** bulanıq sel; 2. gölməçəli, nohurlu; 3. həyəcanlı, iztirablı
**puddly** ['pʌdlı] *adj* gölməçəli, nohurlu, palçıqlı *(yol və s. haq.)*
**pudenda** [pju:'dendə] *n* **pudendum** *isminin cəm forması*
**pudendum** [pju:'dendəm] *n (pl* **-da**) *(adət. pl) anat.* xarici cinsi orqan *(xüs. qadınlarda)*
**pudgy** ['pʌdʒı] *adj (müq. dərəcəsi:* **-ier**, *üst. dərəcəsi:* **-iest**) gödək/alçaq və kök; koppuş, yumru, yupyumru, dolu; **~ fingers** gödək və yoğun barmaqlar; **a ~ child** koppuş/dolu uşaq; **a ~ little man** alçaq, dolu kişi
**pudsy** ['pʌdzı] *adj* kök, koppuş, dolu, yoğun, yumru; **~ hands** yumru/koppuş əllər
**puerile** ['pjuəraıl] *adj* 1. uşaq, uşaq kimi; **to ask ~ questions** uşaq *(yəni sadəlövh)* sualları vermək; **~ behaviour** uşaq hərəkəti/ davranışı; 2. kamala çatmamış, inkişaf etməmiş
**puerility** [pjuə'rılıtı] *n* 1. uşaqlıq, yüngüllük, uşaq hərəkəti; 2. *hüq.* oğlanlıq yaşı *(7-dən 14-ə kimi)*, qızlıq yaşı *(7-dən 12-yə kimi)*
**puerperal** [pju'ə:pərəl] *adj* doğum; zahı; **~ fever** zahı/doğum qızdırması
**puff$^{1}$** [pʌf] *n* 1. əsmə, küləyin əsməsi; 2. hava axını; 3. tüstü, burum, sütun *(tüstü, buxar və s. haq.)*; **~s of smoke** papiros tüstüsünün burumları; 4. tövşümə, ləhləmə, nəfəs alanda/ verəndə çıxarılan səs; fısıldama, fışıldama; **the ~ of a railway engine** parovozun fısıldaması; 5. pudra/kirşan yastığı; 6. büzmə *(qadın paltarında)*; 7. sırınmış yorğan; 8. şiş, suluq, uçuq, qabar, qabarcıq; 9. layiq olmayan tərif; şişirdilmiş reklam; **to give a good ~ to a book** kitabı güclü/bərk reklam etmək
**puff$^{2}$** [pʌf] *v* 1. ani şiddətlə əsmək; *The air from the sea came puffing in our faces Ani şiddətlə dənizdən əsən külək üzümüzə vururdu*; 2. tüstüləmək, tüstü/ buxar burumu buraxmaq; **to ~ at a pipe** qəlyandan az-az tüstü buraxmaq; 3. tövşümək, ləhləmək; 4. pudralamaq, kirşanlamaq, kirşan/pudra vurmaq; kirşanlanmaq, pudralanmaq; 5. həddən artıq təriflәmək; 6. reklam vermək; 7. iddia/ təşəxxüs satmaq, özünü çəkmək, lovğalanmaq; 8. qiymətləri şişirtmək *(hərracda)*; **to ~ away** 1) üfürüb qovmaq/ kənara atmaq/ sovurmaq/ dağıtmaq; *The wind puffed away the seeds of the dandelion Külək zəncirotunun toxumunu kənara dağıtdı/sovurdu*; 2) tüstü buraxa-buraxa irəliləmək; *The engine puffed slowly away Parovoz tüstüləyə-tüstüləyə yavaş-yavaş getdi*; 3) tövşümək, ləhləmək, tüstü/buğ buraxmaq; **to ~ away at a cigar** siqardan kəsik-kəsik tüstü buraxmaq; **to ~ out** 1) üfürüb söndürmək *(şamı)*; 2) dombaltmaq, şi-

şirtmək; **to ~ out *one's* cheeks** yanaqlarını dombaltmaq / şişirtmək; *The toothache puffed out one side of his face Diş ağrısı onun üzünün bir tərəfini şişirtdi*; 3) qabartmaq; *He puffed out his chest O, sinəsini qabartdı*; 4) tövşümək, təngnəfəs olmaq, nəfəsi kəsilmək, çətin nəfəs almaq; *He is quite puffed out after the climb Yoxuşu çıxdıqdan sonra o, çox çətin nəfəs alır*; **to ~ up 1)** burumla/sütunla qalxmaq *(tüstü və s. haq)*; 2) şişmək, dolmaq *(hava və s. ilə)*, qabarmaq; *The sails puffed up Yelkənlər qabardı*; 3) şişmək; kökəlmək, yoğunlamaq

**puffin** [ˈpʌfın] *n zool.* tupik *(şimal dənizində yaşayan quş)*

**pug** [pʌg] *n* mops *(it cinsi)*

**pugilism** [ˈpju:dʒılızm] *n* **1.** yumruq davası; **2.** boks

**pugilist** [ˈpju:dʒılıst] *n* **1.** pəhləvan; boksçu, boksyor; **2.** qızğın/çılğın mübahisəçi, çox höcət adam

**pugnacious** [pʌgˈneıʃəs] *adj* **1.** dalaşqan, savaşqan, davakar; **2.** deyingən, öcəşkən, bədrəftar, yola getməyən; **~ people** deyingən/ öcəşkən adamlar

**pugnacity** [pʌgˈnæsıtı] *n* **1.** dalaşqanlıq, savaşqanlıq, davakarlıq; **2.** deyingənlik, öcəşkənlik, bədrəftarlıq, yolagetməzlik

**puke**[1] [pju:k] *n sl.* qusuntu; qusma, oyümə; **covered in ~** qusuntuya batmış/ bulanmış

**puke**[2] [pju:k] *v* qusmaq, öyümək, ürəyi bulanmaq; *The baby puked (up) all over me Uşaq qusub üst-başımı batırdı; I puked up my dinner Mən naharımı qusdum*

**pull**[1] [pul] *n* **1.** dartma, çəkmə; **to give a ~ at/on the rope** kəndiri dartmaq/çəkmək; *A pull on the rope will make a bell ring Kəndiri dartsan, zəng çalınacaq*; **2.** meyl, həvəs; meyl/həvəs göstərmə; *He felt the pull of the sea again O yenidən dənizə həvəs göstərdi*; **3.** dartma qüvvəsi; **4.** cəhd; **final ~** axırıncı cəhd *(ağır atletikada)*; **5.** çətin yoxuş; *It was a long pull to the top of the mountain Dağın başına yoxuş uzun idi*; **6.** avar çəkmə; **7.** odlu silahın çaxmağını çəkmə; **8.** qurtum, udum; bir qurtum/ udum; **to have a ~ at the bottle** butulkadan bir qurtum almaq /içmək; **9.** qullab; **to take a ~ at *one's* pipe** qəlyanından bir qullab vurmaq; **10.** *d.d.* üstünlük; *He had a great pull over all rivals O, rəqiblərindən çox üstün idi*

**pull**[2] [pul] *v* **1.** dartmaq, çəkmək, dartıb /çəkib aparmaq; *The horse was pulling the cart slowly At arabanı yavaş-yavaş dartıb/çəkib apardı; He pulled me into the room O məni dartıb otağa saldı*; **to ~ *smb.'s* hair** bir kəsin saçından dartmaq /çəkmək; *Don't pull my hair Saçımdan dartma/dartmayın; She pulled my sleeves, She pulled me by the sleeve O mənim paltarımın qolundan dartdı/çəkdi*; **2.** basmaq, çəkmək; **to ~ *one's* hat over *one's* eyes** papağını gözünün üstünə basmaq/ çəkmək; **to ~ a horse** atın yüyənini dartmaq/çəkmək; **3.** dartıb çıxartmaq *(həm də* **to ~ out***)*; **to ~ a cork** probkanı dartıb çıxartmaq; **to ~ a tooth** dişi çəkmək/dartıb çıxartmaq; **4.** çəkmək *(baca, qəlyan və s. haq.)*; *My pipe is pulling very badly today Bu gün mənim qəlyanım çox pis yanır*; **5.** avar çəkmək; qayıqla aparmaq; **6.** yolmaq *(quşu)*; didmək *(kətanı)*; **7.** parçalamaq, dağıtmaq; **to ~ to pieces 1)** parça-parça etmək; **2)** bərk tənqid etmək, daşını daş üstündə qoymamaq; **8.** cəlb etmək, çəkmək *(öz tərəfinə)*, toplamaq; *He pulled more votes than his running mate O, seçkidə rəqibindən daha çox səs topladı*; **9.** *d.d.* almaq *(qiymət)*; *He pulled an A in his English O, ingilis dilindən əla qiymət aldı*; **to ~ about 1)** orabura aparmaq/daşımaq; 2) qaba/kobud rəftar etmək, dartışdırmaq; **to ~ away** ayrılmaq; *It was hard for him to pull away from his ties of home Doğma evindən ayrılmaq ona çox çətin idi*; **to ~ down 1)** aşağı salmaq; **to ~ down blinds** pəncərə pərdələrini aşağı salmaq; 2) sökmək, uçurtmaq; *The old building was pulled down Köhnə evi sökdülər*; 3) qopartmaq; *He pulled the picture down from the wall O, şəkli divardan qopartdı*; 4) alçaltmaq; **to ~ down *smb.'s* pride** bir kəsin şöhrətini/şərəfini/ləyaqətini alçaltmaq; 5) aşağı salmaq *(qiymətdə, rütbədə və s.)*; 6) zəiflətmək, əldən/taqətdən salmaq; *A bout of fever soon pulls you down Qızdırma tutması səni/sizi tezliklə əldən/ taqətdən salacaq*; 7) hakimiyyəti zor gücünə devirmək; **to ~ in 1)** çəkmək, dartmaq, saxlamaq *(atı)*; 2) xərci azaltmaq; 3) yeritmək; **to ~ in troops** *hərb.* ordu yeritmək; **to ~ off 1)** çıxartmaq, soyunmaq; **to ~ off *one's* boots** çəkmələrini çıxartmaq; **to ~ off *one's* hat** papağını çıxartmaq, təzim etmək, salamlaşmaq; **to ~ off *one's* coat** paltosunu soyunmaq; 2) yerindən tərpənmək, uzaqlaşmaq; *The boat pulled off from the shore Qayıq sahildən uzaqlaşdı*; 3) çətin olmasına baxmayaraq həll etmək, müvəffəqiyyətlə həll etmək; *The task was difficult, but we pulled it off Tapşırıq çətin idi, lakin biz onu müvəffəqiyyətlə həll etdik/ yerinə yetirdik*; 4) udmaq, qalib gəlmək *(yarışda)*, priz almaq; **to ~ on 1)** dartmaq, çəkmək; **to ~ on *one's* stockings** corablarını yuxarı çəkmək; 2) avar çəkməyi davam etdirmək; **to ~ out 1)** çıxartmaq; *He pulled out his wallet from his pocket O, portmanatını cibindən çıxartdı; He pulled the drowning child out of the water O, batan uşağı sudan çıxartdı*; 2) çəkib çıxartmaq *(dişi)*; 3) stansiyadan çıxmaq/ uzaqlaşmaq *(qatar haq.)*; **to ~ round** yaxşılaşmaq, özünə gəlmək *(xəstəlikdən sonra)*; *After two days of high fever he began to pull round İki günlük yüksək qızdırmadan sonra o yaxşılaşmağa başladı*; **to ~ together** yaxşı alışmaq/öyrəşmək *(birgə işləməyə)*, əməkdaşlıq etmək, bir-birilə yola getmək; *That family always pulls together O ailənin üzvləri çox mehriban yaşayır*; **to ~ up 1)** saxlamaq, dayandırmaq; *He was pulled up by the chairman İclasın sədri onu dayandırdı*; 2) dayanmaq; *The car pulled up outside the house Maşın evin qarşısında dayandı; Let's pull up at the next village Gəl/Gəlin növbəti kənddə dayanaq*; 3) kökündən çıxartmaq/ qopartmaq; *We pulled up the weeds by the roots Biz alaq otlarını kökündən çıxartdıq/qopartdıq*;

◊ **to ~ *one's* wits together** fikrini toplamaq /cəmləmək, ağlını başına yığmaq; **to ~ caps/wigs** dalaşmaq, küsüşmək; **to ~ out of the fire** fəlakətdən xilas etmək; **to ~ a face** üzgözünü əymək /büzüşdürmək, özünü əzibbüzmək; **to ~ *smb.'s* teeth** silahını əlindən almaq, müqavimətini qırmaq, dişini sındırmaq

**pullet** [ˈpulıt] *n* fərə

**Pullman** [ˈpulmən] *n d.y.* pulman *(böyük dəmir yolu vaqonunun bir növü)*

**pullover** [ˈpul.ouvə] *n* pulover *(yaxalıqsız və düyməsiz toxunma yun köynək)*

**pulp**[1] [pʌlp] *n* **1.** lət, meyvənin əti; **2.** *anat.* pulpa *(diş özəyi)*; **3.** *amer. d.d.* aşağı keyfiyyətli kağızda sensasion hekayələr çap edən jurnal;

◊ **to beat *smb.* to a ~** bərk əzişdirmək, döyüb xurd-xəşil etmək

**pulp**[2] [pʌlp] *v* **1.** əzib lətə döndərmək/xurd-xəşil etmək; əzilib lətə dönmək/xurd-xəşil olmaq; **2.** qabıqdan təmizləmək *(qəhvə dənələrini və s.)*

**pulpit** [ˈpulpıt] *n* kafedra *(vaiz/moizəçi üçün)*; **to occupy the ~** vəz/vaizlik etmək; təbliğ etmək, yaymaq *(fikri, nəzəriyyəni)*

**pulpy** [ˈpʌlpı] *adj* **1.** yumşaq, lətli, ətli; **the ~ substance of the peach** şaftalı ləti; **2.** iradəsiz, ağzıboş, zəif, zəif xasiyyətli/iradəli

**pulsate** [pʌlˈseıt] *v* **1.** *tib.* vurmaq *(nəbz, qan damarı haq.)*; döyünmək *(ürək haq.)*; **2.** titrəmək, əsmək; vibrasiya əmələ gətirmək, yanıb sönmək; **3.** *məc.* lərzəyə gəlmək/düşmək; *The streets were pulsating with life Həyat küçələri lərzəyə gətirmişdi, Küçədə həyat aşıb-daşırdı*

**pulsation** [pʌlˈseıʃn] *n tib.* vurma *(nəbz, qan damarı)*; döyünmə *(ürək)*; **the ~(s) of the blood in the body** bədəndə qan damarının döyünməsi

**pulse**[1] [pʌls] *n* **1.** nəbz; **low/quick/ irregular ~** zəif/tez-tez vuran/qeyri-müntəzəm nəbz; **to feel *smb.'s* ~** bir kəsin nəbzini yoxlamaq; **2.** vurma *(nəbz, qan damarı)*; döyünmə *(ürək)*; **3.** vibrasiya, titrəyiş, titrəmə; **4.** ritm, ahəng;

◊ **to feel *smb.'s* ~** bir kəsin fikrini /niyyətini bilməyə çalışmaq; **to stir *smb.'s* ~s** bir kəsi həyəcanlandırmaq

**pulse**[2] [pʌls] *v* **1.** *tib.* vurmaq *(nəbz, qan damarı)*; döyünmək *(ürək)*; **2.** titrəmək, əsmək; **3.** impuls göndərmək

**pulseless** [ˈpʌlslıs] *adj* **1.** nəbzsiz, nəbzi olmayan; **2.** fəaliyyətsiz, süst

**pulselessness** [ˈpʌlslısnıs] *n* nəbzin olmaması

**pulse-rate** [ˈpʌlsreıt] *n* nəbzin tezliyi

**pulverise** [ˈpʌlvəraız] *v* = **pulverize**

**pulverize** [ˈpʌlvəraız] *v* **1.** toza döndərmək, toza dönmək; **2.** xırdalamaq, səpələmək, parçalamaq; xırdalanmaq, səpələnmək; **3.** tozlandırmaq, pulverizasiya etmək *(mayeni)*; **4.** yatırtmaq, məğlub/ darmadağın/puç etmək; heçə endirmək, boşa çıxartmaq; **to ~ an argument** dəlili boşa çıxartmaq; **to ~ rebellion** qiyamı yatırtmaq

**pulverizer** [ˈpʌlvəraızə] *n* forsunka *(mühərriklərin silindrinə və s.-yə maye və ya toz halında yanacaq vermək üçün cihaz)*, püskürdücü, tozlandırıcı *(cihaz)*; pulverizator *(mayeni toz halında fışqırtmaq üçün cihaz)*

**puma** [ˈpju:mə] *n zool.* puma, kuquar *(Amerikada yaşayan vəhşi pişik)*

**pumice** [ˈpʌmıs] *n* pemza, süngər daşı

**pummel** [ˈpʌml] *v* (-ll-) döymək, vurmaq, döyəcləmək *(xüs. yumruqla)*; bərk yumruqlamaq

**pump**[1] [pʌmp] *n* **1.** nasos; **a fuel ~** yanacaq nasosu; **a foot ~** ayaq nasosu; **a bicycle ~** velosiped nasosu; *A pump in the boiler sends hot water round the central heating system Qazanxanadakı nasos isti suyu mərkəzi istilik sisteminə göndərir*; **2.** nasosla vurma, nasoslama

**pump**[2] [pʌmp] *v* **1.** nasoslamaq, nasosla vurmaq; **to ~ air into a tyre** şinə nasosla hava vurmaq; **to ~ water from a well** quyudan nasosla su vurmaq; **2.** itələmək, göndərmək; *The heart pumps blood through the arteries Ürək qanı damarlarla göndərir*; **3.** soruşub bilmək/ öyrənmək, söz çəkmək/almaq, öyrənməyə çalışmaq; **to ~ a prisoner** dustaqdan söz almağa çalışmaq; **4.** vurmaq *(nəbz)*; döyünmək *(ürək)*; *His heart pumped hard Onun ürəyi bərk döyündü*; **to ~ off** çəkmək *(nasosla)*, boşaltmaq *(suyu, havanı və s.)*; **to ~ out** çəkmək/boşaltmaq *(suyu və s.)*; **to ~ over** çəkmək, vurmaq, çəkib vurmaq *(nasosla bir yerdən başqa yerə)*; **to ~ up** doldurmaq *(nasosla)*; **to ~ up a tire/tyre** şini doldurmaq;

◊ **to ~ *smb.'s* hand** əlini silkələmək *(əl verərkən)*; **to ~ a ship** səmərəsiz işlə məşğul olmaq

**pump-house** [ˈpʌmphaus] *n* nasos stansiyası

**pumpkin**[1] [ˈpʌmpkın] *n* **1.** *bot.* balqabaq, kudu, boranı; **2.** gic/axmaq/sarsaq/səfeh adam

**pumpkin**[2] [ˈpʌmpkın] *adj* balqabaq, boranı; **~ soup** balqabaq/boranı şorbası; **~ pie** balqabaq/boranı piroqu

**pumpkin-head** [ˈpʌmpkınhed] *n d.d.* korazehin/ axmaq/ qanmaz adam

**pumpkin-seed** [ˈpʌmpkınsi:d] *n* **1.** balqabaq/ kudu/boranı toxumu; **2.** şəlpəqulaq xanı balığı

**pun**[1] [pʌn] *n* söz oyunu; kalambur, cinas

**pun**[2] [pʌn] *v* (-nn-) cinasla danışmaq

**punch[1]** [pʌntʃ] *n* I **1**. yumruq; **to give *smb.* a ~ on the nose**/*amer*. **in the nose** bir kəsin burnunun üstünə yumruq vurmaq; **2**. güc, enerji, inad; **a team with a terrific ~** çox inadlı/güclü komanda;
◊ **to pull no ~es** amansızcasına/ amansızlıqla tənqid etmək

**punch** [pʌntʃ] *n* II **1**. komposter *(biletlərə və s. yoxlama işarəsi vuran alət)*; **2**. *tex*. deşikaçan dəzgah

**punch[2]** [pʌntʃ] *v* I **1**. yumruqla zərbə endirmək/ vurmaq; **to ~ *smb.*'s head** bir kəsin başına yumruq vurmaq; **to ~ a pillow into shape** balışı/yastığı yumruqla vurub formaya salmaq; **2**. *amer*. malı/mal-qaranı sürmək *(ağacla)*

**punch** [pʌntʃ] *v* II **1**. deşik/dəlik açmaq; **2**. komposterləmək *(bileti və s.)*

**puncher** [ˈpʌntʃəʳ] *n* I **1**. yumruq; **a heavy/ strong ~** ağır/güclü yumruq; **2**. deşikaçan *(alət)*; deşmə dəzgahı; **3**. perforator *(süxur qazmaq üçün mexaniki burğu)*; pnevmatik çəkic

**puncher** [ˈpʌntʃəʳ] *n* II *amer*. kovboy *(Şimali Amerikada atlı çoban/naxırçı)*

**punctilious** [pʌŋkˈtılıəs] *adj* **1**. pedant, rəsmiyyətçilik gözləyən, rəsmiyyətçiliyə riayət edən; son dərəcə dəqiq/dürüst; **2**. ədəb/ nəzakət gözləyən, çox ədəbli/ nəzakətli; **~ hostess** ədəb gözləyən/çox ədəbli ev sahibəsi

**punctual** [ˈpʌŋktʃəl] *adj* dəqiq, səliqəli, diqqətli, işi tam/düz vaxtında yerinə yetirən; **to be ~ in the performance of *one's* duties** öz vəzifəsini dəqiq/tam yerinə yetirmək; **to be ~ for an appointment** görüşə gəlməkdə dəqiq olmaq, görüşə düz vaxtında gəlmək; *She's never punctual in answering letters; she's always late O, heç vaxt məktuba vaxtında cavab vermir; həmişə gecikir*

**punctuality** [ˌpʌŋktʃuˈælıtı] *n* dəqiqlik, son dərəcə səliqəlilik/diqqətlilik, tam/düz vaxtında yerinə yetirmə

**punctually** [ˈpʌŋktʃuəlı] *adv* düz, dürüst, tamamilə düzgün, dümdüz, tam/düz vaxtında; **to arrive ~** düz/tam vaxtında gəlmək; **to depart ~** düz/tam vaxtında getmək

**punctuate** [ˈpʌŋktʃueıt] *v* **1**. durğu işarələri qoymaq; **2**. kəsmək *(nitqi və s.)*; *His speech was punctuated by cheers Onun nitqi alqışlarla kəsildi*

**punctuation** [ˌpʌŋktʃuˈeıʃn] *n* punktuasiya *(durğu işarələrinin qoyulması üsulu)*; **mistakes in spelling and ~** orfoqrafiya və durğu işarələrində səhvlər

**puncture[1]** [ˈpʌŋktʃəʳ] *n* **1**. deşik, dəlik; deşmə, dəlmə; punksiya *(müalicə məqsədilə bədənin bir yerini şpris və ya başqa alətlə deşmə)*; **2**. deşik *(xüs. şində)*; **to mend a ~** deşiyi yamamaq; *I got a puncture on the way and arrived late Yolda şinim deşildi və mən gec gəldim*

**puncture[2]** [ˈpʌŋktʃəʳ] *v* **1**. deşmək, dəlmək; deşilmək, dəlinmək; *Both my tyres/tires punctured on the stony road Daşlı yolda mənim şinlərimin hər ikisi deşildi*; **2**. tatuirovka etmək/etdirmək, bədəninə şəkillər döydürmək; **3**. korlamaq, xarab etmək; pozmaq, dağıtmaq; puça çıxartmaq; **to ~ a scheme** planı pozmaq /puça çıxartmaq

**pungency** [ˈpʌndʒənsı] *n* **1**. acılıq, kəskinlik; **2**. acı istehza, acı/kinayəli söz

**pungent** [ˈpʌndʒənt] *adj* **1**. tünd, kəskin; **~ sauce** tünd sous; **the ~ smell of garlic** sarımsağın kəskin iyi; **2**. *məc*. kəskin; **~ criticism/satire** kəskin tənqid/satira

**pungently** [ˈpʌndʒəntlı] *adv* kəskin, acı, acı-acı, kəskin surətdə, son dərəcə

**puniness** [ˈpju:nınıs] *n* balacalıq, zəiflik, xırdalıq

**punish** [ˈpʌnıʃ] *v* **1**. cəzalandırmaq, cəza vermək; tənbeh etmək; *The child was punished for disobedience Uşaq sözə baxmadığına görə cəzalandırıldı*; **2**. *d.d.* qaba/kobud davranmaq; **3**. zədələmək, xətər yetirmək, ziyan vurmaq; *The ship was considerably punished by the battery Batareya gəmiyə xeyli ziyan verdi/gəmini ciddi surətdə zədələdi*

**punishability** [ˌpʌnıʃəˈbılıtı] *n* = **punishableness**

**punishable** [ˈpʌnıʃəbl] *adj* cəzaya layiq, cəzalanmalı; **~ offence** cəzaya layiq cinayət; *This crime is punishable by death in some countries Bu cinayət bəzi ölkələrdə ölümlə cəzalandırılır*

**punishableness** [ˈpʌnıʃəblnıs] *n* cəzaya layiqlik, cəzaya səbəb/layiq olma

**punishment** [ˈpʌnıʃmənt] *n* **1**. cəza; tənbeh; **to escape ~** cəzadan yaxa qurtarmaq; **capital ~** ölüm cəzası; *The punishment should fit the crime Cəza cinayətə uyğun olmalıdır*; **to be brought to ~ for *one's* crime** cinayətə görə cəzalandırılmaq; **2**. zərər, zədə, korlanma; **to receive ~** zədə almaq

**punitive** [ˈpju:nıtıv] *adj* **1**. cəza; **~ expedition** cəza ekspedisiyası; **~ taxes** cəza vergiləri; **to take ~ action against *smb.*** bir kəsə qarşı cəza tədbiri görmək; **to carry out a ~ raid on a rebel** village qiyam qaldırmış kənddə cəza reydi keçirmək; **2**. çox ağır/ciddi; **~ taxation** ağır vergi qoyma

**punnet** [ˈpʌnıt] *n* girdə səbət *(meyvə və tərəvəz üçün)*

**punster** [ˈpʌnstəʳ] *n* kalamburçu, cinasçı *(cinasla danışmağı bacaran/sevən adam)*

**punt-about** [ˈpʌntəˌbaut] *n* bədənin açılması üçün oyundan əvvəl edilən hərəkətlər *(futbol oyununda)*

**puny** [ˈpju:nı] *adj* **(-ier, -iest)** balaca, xırda, kiçik, zəif; **~ muscles** zəif əzələlər; **~ little fellow** balaca zəif adam; **~ little arms and legs** balaca zəif qollar və qıçlar

**pup[1]** [pʌp] *n* **1**. küçük; canavar/tülkü və s. balası; **2**. özündən razı/iddialı cavan; uşaq, körpə *(təcrübəsiz mənasında)*;
◊ **to sell *smb.* a ~** satarkən bir kəsi aldatmaq /bir kəsə kələk gəlmək



**pup[2]** [pʌp] *v* küçükləmək, balalamaq *(tülkü, canavar və s. haq.)*

**pupil** [ˈpju:pl] *n* I **1**. şagird; **a former ~ of the school** məktəbin sabiq/əvvəlki şagirdi; *There are 30 pupils in the class Sinifdə 30 şagird var*; **2**. davamçı, şagird; **to be *smb.*'s ~** bir kəsin davamçısı/şagirdi olmaq; *The painting is the work of one of Rembrant's pupils Bu şəkil Rembrantın şagirdlərindən birinindir*

**pupil** [ˈpju:pl] *n* II bəbək, göz bəbəyi

**puppet[1]** [ˈpʌpıt] *n* oyuncaq, kukla

**puppet[2]** [ˈpʌpıt] *adj* oyuncaq; **~ government** oyuncaq hökumət

**puppet-play** [ˈpʌpıtpleı] *n* kukla tamaşası

**puppet-show** [ˈpʌpıtʃou] *n* **1**. kukla tamaşası; **2**. kukla teatrı

**puppet-theatre** [ˈpʌpıtˌθıətəʳ] *n* kukla teatrı

**puppy[1]** [ˈpʌpı] *n* **1**. küçük; **2**. suiti balası; **3**. özündən razı olan/özünübəyənən modabaz

**puppy[2]** [ˈpʌpı] *v* küçükləmək; balalamaq *(tülkü, canavar və s. haq.)*

**purblind** [ˈpə:blaınd] *adj* **1**. koruş, gözü pis görən; **2**. uzağı görməyən/görə bilməyən; **~ policy** uzağı görməyən siyasət

**purchase[1]** [ˈpə:tʃəs] *n* **1**. alma, alınma; alış, satın alma; **the date of ~** alınma tarixi; **~ and sale** alış və satış, alver; **~ on credit** kreditəalma; **to make some ~s** alış-veriş /bazarlıq etmək; **2**. illik gəlir *(torpaqdan)*; dəyər, qiymət; **at ten years' ~** illik gəlirin on misli qədər; **3**. üstünlük, üstün vəziyyət; **4**. dayaq nöqtəsi; **a safe ~ for my foot** ayağım üçün təhlükəsiz dayaq; *The climber tried to gain a purchase with his foot on a narrow edge of the rock Alpinist qayanın dar kənarında ayağına yer/dayaq tapmağa çalışdı*

**purchase[2]** [ˈpə:tʃəs] *adj* alış; alıcılıq; **~ price** alış qiyməti; *The purchase price is low if you pay by cash Nağd pulla alsan /alsanız, alış qiyməti aşağıdır*; **~ power** alıcılıq qabiliyyəti

**purchase[3]** [ˈpə:tʃəs] *v* **1**. almaq, satın almaq; bazarlıq etmək; *They have just purchased a new house in the country Onlar yenicə kənddə təzə ev alıblar*; **2**. əldə etmək, qazanmaq; **to ~ freedom with blood** qan hesabına/bahasına azadlıq qazanmaq/əldə etmək

**purchaser** [ˈpə:tʃəsəʳ] *n* alıcı, müştəri; **to find ~** müştəri tapmaq

**purchasing** [ˈpə:tʃəsıŋ] *adj* alıcılıq; **~ power** alıcılıq qabiliyyəti; *Inflation reduces the purchasing power of people İnflyasiya adamların alıcılıq qabiliyyətini azaldır*

**pure** [pjuəʳ] *adj* **1**. təmiz, xalis, qatışığı olmayan, qatışıqsız; **~ drinking water** təmiz içməli su; **~ alcohol** təmiz/qatışıqsız spirt; **~ gold/silver** xalis qızıl/gümüş; **~ tea** qatışıqsız/ təmiz çay; **~ air** təmiz hava; *The air is so pure in these mountains Bu dağlarda hava çox təmizdir*; **2**. təbii; **~ silk/ cotton/ wool** təbii ipək/ pambıq/ yun; **3**. günahsız, məsum; *She is still a pure young girl O hələ də məsum gənc qızdır*; **4**. yekcins, qatışığı olmayan, təmiz *(rəng haq.)*; **~ white** təmiz ağ rəng; **5**. düz, düzgün, müəyyən normaya cavab verən *(dil və s. haq.)*; *He speaks pure English O, ingiliscə təmiz danışır*; **6**. nəzəri, mücərrəd; **~ physics** nəzəri fizika; **7**. doğru, düz, gerçək; doğruçu, düzdanışan, vicdanlı, namuslu; **~ upright character** vicdanlı /namuslu adam;
◊ *That's the truth pure and simple Bu əsl həqiqətdir; It's pure and simple laziness Bu sadəcə olaraq tənbəllikdir*

**purely** [ˈpjuəlı] *adv* **1**. sadəcə, sadəcə olaraq; *I don't want any reward for my help; I gave it purely (and simply) out of friendship Mən köməyim üçün heç bir bəxşiş istəmirəm; mən onu sadəcə olaraq dostluq naminə/ xatirinə etdim*; **2**. təmiz; **to speak English ~** ingiliscə təmiz danışmaq; **3**. təmiz, ismətlə; **to live ~** təmiz/ismətlə yaşamaq

**pureness** [ˈpjuənıs] *n* = **purity**

**purgation** [pə:ˈgeıʃn] *n* **1**. təmizləmə, təmizlənmə; **2**. *tib*. boşaltma, boşaldılma *(mədəni, bağırsağı)*

**purgative[1]** [ˈpə:gətıv] *n* işlətmə dərmanı

**purgative[2]** [ˈpə:gətıv] *adj* **1**. *tib*. təmizləyici, təmizləyən; **~ enema** təmizləyici imalə; **2**. *hüq*. yüngülləşdirici; yuyan; **~ evidence** cəzanı yüngülləşdirici şahidlik; **~ punishment** günahı yuyan cəza

**purge[1]** [pə:dʒ] *n* **1**. təmizləmə, təmizlənmə; **2**. *tib*. işlətmə dərmanı

**purge[2]** [pə:dʒ] *v* **1**. təmizləmək; yumaq; **to ~ the party of extremists** partiyanı ekstremistlərdən təmizləmək; **to be ~ed of/from sin** *din*. günahdan təmizlənmək, günahını yumaq; **2**. *tib*. işlətmə dərmanı vermək; bağırsaqları boşaltmaq; **to ~ away, ~off, ~ out** təmizləmək/ boşaltmaq

**purify** [ˈpjuərıfaı] *v* **1**. *(pt, pp* **-fied**) təmizləmək; **to ~ air** havanı təmizləmək; **to ~ a language of barbarisms** dili varvarizmlərdən / yersiz işlənən sözlərdən təmizləmək; *The water is purified as it passes through the rock Süxurlardan keçərkən su təmizlənir; The soil has to be purified of all bacteria Torpaq bütün bakteriyalardan təmizlənməlidir*; **2**. azad etmək *(günahdan)*

**purism** [ˈpjuərızm] *n* purizm *(mühafizəkarlıq üzündən hər hansı bir şeyi, məs. dili olduğu kimi, dəyişməz və təmiz şəkildə saxlamağa çalışaraq, hər cür yeniliyə qarşı mübarizədə ifrata varma)*

**purist** [ˈpjuərıst] *n* purist *(purizm tərəfdarı)*

**purity** [ˈpjuərıtı] *n* təmizlik; saflıq; **~ of colour/ sound** rəngin/səsin təmizliyi; **~ of the water** suyun təmizliyi /saflığı; **to test the ~ of the water** suyun təmizliyini /saflığını yoxlamaq

**purl[1]** [pə:l] *n* I güləbətin; saçaq

**purl** [pə:l] *n* II şırıltı, şırıldama; **the ~ of water/of a brook** suyun/kiçik çayın şırıltısı

**purl[2]** [pə:l] *v* I güləbətin/saçaq tikmək

**purl** [pə:l] *v* II şırıldamaq, şırıltı ilə axmaq
**purloin** [pə:'lɔın] *v* oğurlamaq, qaçırtmaq; mənimsəmək; xırda oğurluq etmək
**purloiner** [pə:'lɔınəʳ] *n* xırda şeylər oğrusu
**purple**[1] ['pə:pl] *n* 1. firfir *(tünd qırmızı boya/rəng)*, al-qırmızı rəng; 2. bənövşəyi rəng; 3. porfira *(padşahların geyindiyi tünd-qırmızı xalat)*
**purple**[2] ['pə:pl] *adj* 1. bənövşəyi, bənövşəyi rəngli; 2. tünd-qırmızı, al-qırmızı; qıpqırmızı; **a ~ flower/dress** tünd-qırmızı/al-qırmızı çiçək/ paltar; *His face was/went purple with rage Qəzəbdən onun sifəti qıpqırmızı oldu/ qıpqırmızı qızardı*; **to be/to go ~ with rage** qəzəbdən /acıqdan/hirsdən qıpqırmızı olmaq/ qızarmaq; 3. *d.d.* parlaq, təmtəraqlı, möhtəşəm, gözəl; *I had one purple moment in my life Mənim həyatımda bir gözəl/parlaq an olub*
**purple**[3] ['pə:pl] *v* 1. bənövşəyi/tünd-qırmızı boyamaq, al-qırmızı etmək; 2. qızarmaq, al-qırmızı olmaq, al-qırmızı rəngə boyanmaq
**purplish** ['pə:plıʃ] *adj* qırmızıya çalar, qırmızımtıl
**purport**[1] ['pə:pət] *n* mahiyyət, məna, məğz; **the ~ of a document** sənədin mahiyyəti/ mənası; *I do not understand the purport of his question Mən onun sualının mənasını başa düşmürəm*
**purport**[2] ['pə:pət] *v* fikrində tutmaq, güman/ fərz etmək, nəzərdə tutmaq; göstərmək, bildirmək; *His speech may purport his early resignation Onun nitqindən fərz/ güman etmək olar ki, o vaxtından əvvəl istefaya gedəcək*
**purpose**[1] ['pə:pəs] *n* 1. məqsəd, niyyət, məram, arzu, fikir; **the ~ of the meeting** görüşün məqsədi; *What is the purpose of the meeting? Görüşün məqsədi nədir?*; **for practical ~s** praktik məqsədlər üçün; **to answer/to serve the ~** məqsədə müvafiq olmaq/cavab vermək; **to gain/to achieve *one's* ~** məqsədinə nail olmaq/çatmaq; **on ~** qəsdən, bilə-bilə, bilərəkdən; **to do *smth.* on ~** bir şeyi qəsdən/ bilə-bilə etmək; 2. nəticə, müvəffəqiyyət; **to good ~** böyük müvəffəqiyyətlə; **to little ~** demək olar ki, nəticəsiz; 3. müəyyən məqsəd əldə etməyə çalışma, müəyyən məqsədə yönəldilmə; iradə, qətiyyət, əzm, səbat, qətilik; *He is weak of purpose O, qətiyyətsizdir*
**purpose**[2] ['pə:pəs] *v* məqsədi/məramı olmaq; ...niyyətində/...fikrində/ ...qəsdində olmaq; *They purpose a further attempt Onlar yeni cəhd göstərmək fikrindədirlər*
**purposeful** ['pə:pəsfl] *n* 1. məqsədyönlü, müəyyən məqsədə yönəldilmiş, aydın/ müəyyən məqsədi olan, məqsədəuyğun; qətiyyətli, əzmli, səbatlı; **~ character** qətiyyətli xarakter; 2. məzmunlu; **~ narrative** məzmunlu hekayə /povest; 3. qəsdən/qəsdlə edilən, qərəzlə edilmiş
**purposefulness** ['pə:pəsflnıs] *n* müəyyən məqsədə yönəldilmə, aydın məqsədi olma, müəyyən məqsəd əldə etməyə çalışma

**purposeless** ['pə:pəslıs] *adj* 1. məqsədsiz, niyyətsiz; mənasız, faydasız, boş; **a ~ life** mənasız/ boş həyat; 2. qəsdsiz, qərəzsiz; qəsdən edilməyən
**purposely** ['pə:pəslı] *adv* qəsdən, bilə-bilə, bilərəkdən; **to do *smth.* ~** bir şeyi qəsdən etmək; *He was purposely late O qəsdən/ bilərəkdən gecikmişdi*
**purposive** ['pə:pəsıv] *adj* 1. qətiyyətli, cəsarətli, əzmli, səbatlı; 2. qəsdlə/ qərəzlə/ məqsədlə edilən, qəsdən edilmiş, düşünülmüş; **~ action** qəsdən edilmiş hərəkət
**purr**[1] [pə:ʳ] *n* 1. xoruldama, mırıldama; **the ~ of a cat** pişiyin xoruldaması; 2. *tex.* sakit işləmə *(mühərrik haq.)*
**purr**[2] [pə:ʳ] *v* 1. xoruldamaq *(pişik haq.)*, mırıldamaq; 2. *məc.* zümzümə etmək; 3. sakit işləmək *(mühərrik haq.)*
**purse**[1] [pə:s] *n* 1. pul kisəsi; çanta; redikül *(qadın əl çantası)*; *She took a coin from her purse and gave it to the child O, pul kisəsindən bir sikkə çıxartdı və onu uşağa verdi*; 2. pul, dövlət; **a long/ fat/ heavy ~** var-dövlət; **a slender/ lean/ light ~** boş pul kisəsi, pulsuzluq, kasıblıq; **the public ~** xəzinə; **to open *one's* ~** səxavətə gəlmək, xərcləmək; **to button up *one's* ~** xəsislik/simiclik etmək; 3. pul mükafatı/ prizi; **to give/to put up a ~** pul mükafatı vermək; 4. *zool.* kisə
**purse**[2] [pə:s] *v* 1. qırışdırmaq, büzüşdürmək, büzmək, qırış-qırış etmək; qırçınlamaq *(həm də* **to ~ up)**; **to ~ (up) *one's* mouth** ağzını büzmək; 2. pul kisəsinə qoymaq
**pursue** [pə'sju:] *v* 1. izləmək, güdmək, dalınca düşmək; təqib etmək *(bir kəsi)*; **to ~ a runaway** qaçağı təqib etmək; *Ill luck pursued her till her death Uğursuzluq onu ölənə qədər təqib etdi/izlədi*; 2. axtarmaq, əldə etmək; **to ~ pleasure** kef axtarmaq; 3. aparmaq, yeritmək; **to ~ the policy of peace** sülh siyasəti aparmaq /yeritmək; 4. davam etdirmək; **to ~ *one's* studies** təhsilini davam etdirmək; *He is pursuing his studies at the university O, təhsilini universitetdə davam etdirir*; 5. məşğul olmaq *(bir şeylə)*; **to ~ science/art** elmlə /incəsənətlə məşğul olmaq
**pursuer** [pə'sju:əʳ] *n* 1. təqibçi, təqib edən; əzab /əziyyət verən, zülm edən; 2. bir şeylə məşğul olan, bir şeyə can atan, özünü bir şeyə həsr edən *(adam)*; **~ of knowledge** elm öyrənməyə can atan/ özünü elmə həsr edən adam
**persuit** [pə'sju:t] *n* 1. təqib etmə, izləmə; **~ of the enemy** düşməni təqib etmə; 2. axtarış; can atma, cəhd, arzu, meyl; əldə etməyə çalışma; **~ of wealth** var-dövlət əldə etməyə can atma/ çalışma; **~ of happiness** xoşbəxtliyə can atma; 3. məşğuliyyət, iş, peşə; *Hunting is my favourite persuit Ovçuluq mənim çox sevdiyim məşğuliyyətdir*; **our daily ~s** bizim gündəlik işimiz/peşəmiz; 4. məşğul olma, yerinə yetirmə; **the ~ of *one's* profession** öz işini yerinə yetirmə



**purulence** ['pjuərələns] *n* irin, çirk; irinləmə, irin etmə
**purulent** ['pjuərələnt] *adj* irinli, irin edən; **~ discharge** irin ifrazatı; **a ~ discharge from the ear** qulaqdan irin ifrazatı/ gəlməsi
**purvey** [pə'veı] *v* ərzaqla/azuqə ilə təmin etmək, ərzaq /azuqə göndərmək
**purveyance** [pə:'veıəns] *n* 1. təmin etmə, göndərmə; **the ~ of supplies for an army** orduya ərzaq/azuqə göndərmə, ordunu ərzaqla/azuqə ilə təmin etmə; 2. ərzaq, azuqə
**purveyor** [pə'veıəʳ] *n* tədarükçü, təchiz edən, mal verən/göndərən *(adam)*
**purview** ['pə:vju:] *n* 1. sahə, dairə; mühit; fəaliyyət sahəsi/dairəsi; kompetensiya, səriştə, bilik; **within the ~ of a school-teacher** məktəb müəllimi kompetensiyası daxilində; 2. görüş dairəsi/sahəsi, bilik səviyyəsi/ dərəcəsi
**pus** [pʌs] *n* irin, çirk; *The bandage was soaked in blood and pus Sarğı qan və irindən islanmışdı*
**push**[1] [puʃ] *n* 1. itələmə; təkan; **to give a ~** itələmək; *He gave me a violent push in the back O məni daldan bərk itələdi; Give the door a hard push Qapını bərk itələ/itələyin*; 2. təzyiq; təzyiq etmə, basma, sıxma, sıxışdırma; **the ~ of a crowd** xalqın/camaatın təzyiqi; 3. zərbə *(buynuzla və ya ucuiti silahla)*; 4. *hərb. d.d.* güclü hücum; 5. *d.d.* kömək, yardım, arxa; himayə, havadarlıq, hamilik; **to give *smb.* a ~** bir kəsə havadarlıq etmək/arxa olmaq; 6. həlledici an; **at a ~** həlledici anda; *When it came to the push, I found I had forgotten all I intended to say Həlledici anda mən demək istədiyimi büsbütün unutmuşdum*; 7. qətiyyət, qətilik, əzm, səbat; təşəbbüskarlıq; **a man of ~ and go** qətiyyətli/təşəbbüskar adam; 8. cəhd, səy; **to make a ~** cəhd etmək, səy göstərmək; *We must make a push to get it done Bunu etmək üçün biz cəhd etməliyik/səy göstərməliyik*; 9. arzu, istək, stimul; təkan; səbəb; **inner ~** daxili səbəb/stimul; 10. azad etmə/ edilmə, çıxartma, çıxardılma; **to give the ~** azad etmək, çıxartmaq; **to get the ~** çıxardılmaq, azad edilmək;

◊ **to be put to the ~** ciddi sınağa məruz qalmaq, ciddi sınaqdan keçmək
**push**[2] [puʃ] *v* 1. itələmək; **to ~ *smb./smth.*** bir kəsi /şeyi itələmək; *Someone pushed me Kimsə məni itələdi; Let's push the table nearer to the wall Gəl/Gəlin stolu bir az divara tərəf itələyək; He pushed against the door with his shoulder O, çiyni ilə qapını itələdi*; 2. itələyib/basıb keçirtmək, dürtmək; **to ~ a cork into a bottle** probkanı butulkaya dürtmək; 3. itələyib/yarıb keçmək; *He pushed through the crowd O, camaatı/ izdihamı yarıb keçdi*; 4. qovmaq, bərk sürmək *(atı)*, sürətləndirmək, sürəti artırmaq/ çoxaltmaq; **to ~ the vessel** gəminin sürətini artırmaq; 5. basmaq; **to ~ the button** düyməni basmaq; *Don't push against the fence, it will give way Hasarı basma/basmayın, uçacaq*; 6. təzyiq göstərmək; təkid/israr etmək; *We are pushed for an answer Bizdən təkidlə cavab istəyirlər*; 7. əldə etmək, nail olmaq; əldə etməyə çalışmaq; **to ~ *one's* claims** öz tələblərində təkid etmək; 8. köməklik göstərmək, himayədarlıq/ himayə etmək *(bir kəsə)*; **to ~ a friend** dosta köməklik/ himayədarlıq etmək; 9. keçirmək; **to ~ the war into the enemy's country** müharibəni düşmənin ölkəsinə keçirmək; 10. irəliləmək, irəli aparmaq, inkişaf etdirmək *(ideyanı, sistemi, nəzəriyyəni və s.)*; 11. reklam etmək, həddindən artıq tərifləmək; **to ~ *one's* wares** öz malını reklam etmək; 12. *amer.* kontrabanda ilə məşğul olmaq; narkotik maddələr satmaq; **to ~ along** yolu davam etdirmək; *I must push along now, it's nearly eight o'clock Təxminən saat səkkizdir, mən yolumu davam etdirməliyəm*; **to ~ aside** 1) kənara itələmək; 2) aradan qaldırmaq; **to ~ aside all obstacles** bütün maneələri aradan qaldırmaq; **to ~ away** uzaqlaşdırmaq, özündən kənar etmək, kənara itələmək; *The girl pushed him away angrily Qız onu acıqlı-acıqlı/hirsli-hirsli kənara itələdi; The child pushed away the plate Uşaq boşqabı kənara itələdi*; **to ~ back** 1) kənara/ geri itələmək; *The police pushed back the crowd Polis camaatı geri itələdi*; 2) geri çəkmək; *He pushed back his chair O, stulunu geri çəkdi*; **to ~ down** yerə yıxmaq/ sərmək; **to ~ forward** 1) tələsdirmək, tələsmək, irəli atılmaq/ hücum etmək; **to ~ forward to the attack** hücuma atılmaq/ keçmək; **to ~ out** 1) qabağa çıxmaq; *The cape pushes out into the sea coğ. Burun dənizin içinə çıxır*; 2) qabağa uzatmaq; *He pushed out his lower lip O, alt dodağını qabağa uzatdı*; 3) zoğ/cücərti vermək; 4) dənizə çıxmaq; **to ~ over** yıxmaq; *The boy pushed over the chair Oğlan stulu yıxdı*; **to ~ up** 1) qaldırmaq; *He pushed up his spectacles O, eynəyini yuxarı qaldırdı*; **to ~ up *one's* veil** duvağını yuxarı qaldırmaq;

◊ **to ~ *one's* way** həyatda özünə yol açmaq; **to ~ to the wall** divara dirəmək/ qısnamaq; **to ~ *one's* luck** bəxtini/taleyini sınamaq, təhlükəli işə girişmək
**push-bicycle** ['puʃ.baısıkl] *n* velosiped
**push-bike** ['puʃbaık] *n d.d.* = **push-bicycle**
**push-button** ['puʃ.bʌtn] *n* düymə *(zəngin və s.)*
**pushcart** ['puʃka:t] *n* əl arabası
**pushchair** ['puʃtʃeəʳ] *n* açılıb-örtülən təkərli uşaq stulu
**push-cycle** ['puʃ.saıkl] *n d.d.* = **push-bicycle**
**push-down** ['puʃdaun] *n av.* təyyarənin enməsi
**pusher** ['puʃəʳ] *n* 1. təkançı, itələyici *(qatarı daldan itələyən köməkçi parovoz)*; 2. tullayıcı *(silahda; atılmış patron gilizini avtomatik surətdə bayıra tullayan mexanizm)*; 3. *amer. d.d.* narkotik maddə alverçisi; 4. manevr parovozu *(qatarları düzəltmək üçün vaqonları itələyib bir yerdən başqa yerə aparan parovoz)*
**pushover** ['puʃ.ouvəʳ] *n* 1. zəif oyunçu/ komanda; 2. iradəsiz/zəif iradəli adam; 3. manyak

**pusillanimity** [ˌpju:sɪlə'nɪmɪtɪ] *n* cəsarətsizlik, qorxaqlıq, ürəksizlik

**pusillanimous** [ˌpju:sɪ'lænɪməs] *adj* qorxaq, ürəksiz, cəsarətsiz, ağciyər; **a ~ minister** qorxaq/cəsarətsiz nazir

**puss** [pus] *n* **1.** piş-piş *(pişiyi çağırmaq üçün çıxarılan səs)*; **2.** *amer. sl.* üz, sifət; **a smack in the ~** üzdən maç etmə/marçıltı ilə öpmə

**pussy** ['pusɪ] *n* pişik

**pustulate¹** ['pʌstjulɪt] *adj* sızanaqlı, civzəli, sızanaqla/ civzə ilə örtülü

**pustulate²** ['pʌstjulɪt] *v* sızanaqla/civzə ilə örtülmək

**pustule** ['pʌstju:l] *n* sızanaq, irinlik

**put** [put] *v (-tt-; pt, pp* **put)** **1.** qoymaq; **to ~ the book/ the dictionary/the pen/the plate,** *etc.* **on the table** kitabı/lüğəti/ qələmi/boşqabı *və s.* stolun üstünə qoymaq; *Don't put the basket on the table; put it on the floor Səbəti stolun üstünə qoyma/ qoymayın; onu döşəməyə qoy/qoyun*; **to ~ things on/in their right place** şeyləri öz yerinə qoymaq; *Put the knife on its right place Bıçağı öz yerinə qoy/qoyun*; **to ~ a child to school** uşağı məktəbə qoymaq; **to ~ the motion to the vote** məsələni səsə qoymaq; **to ~ a mark/a tick** işarə qoymaq; *Put a mark/a tick against his name Onun adının qarşısında işarə/quş qoy/qoyun*; **to ~ money in/into a bank** banka pul qoymaq; **to ~ a price on a painting** tabloya/rəsmə qiymət qoymaq; **to ~ a tax on** ***smth.*** bir şeyə vergi qoymaq; **to ~ a veto on** ***smth.*** bir şeyə veto qoymaq, bir şeyi qadağan /yasaq etmək; **to ~ blame on** ***smb.*** günahı bir kəsin boynuna/üstünə qoymaq; *He always tries to put the blame on me O həmişə çalışır ki, günahı mənim boynuma qoysun*; **2.** yatırtmaq; **to ~ a child to bed** uşağı yatırtmaq; **3.** salmaq; **to ~ sugar in** ***smth.*** bir şeyə qənd salmaq; *Put some sugar in my coffee Mənim qəhvəmə bir az qənd sal/salın;* **4.** təyin etmək, qoymaq *(işə)*; **to ~ men to work** adamları işə təyin etmək /qoymaq; **to ~** ***smb.*** **in hospital** bir kəsi xəstəxanaya qoymaq; **5.** yerləşdirmək; *The refugees were put in the hostel Qaçqınlar yataqxanada yerləşdirildi*; **6.** daxil etmək; **to ~ in the list** siyahıya daxil etmək; **to ~ into the field** *id.* yarış iştirakçıları sırasına daxil etmək; **7. (to)** yaxınlaşdırmaq, taxmaq, yapışdırmaq; **to ~ a glass to** ***one's*** **lips** stəkanı dodaqlarına yaxınlaşdırmaq; *He put a flower against the girl's hair O, qızın saçına bir çiçək taxdı*; **8.** ifadə/izah/şərh/bəyan etmək, söyləmək, anlatmaq; şərh etmək *(fikri və s.)*; **to ~** ***one's*** **ideas into words** fikrini sözlərlə ifadə etmək; **to ~** ***one's*** **proposal on paper** təklifini yazılı şəkildə bəyan etmək; **9.** tərcümə etmək *(başqa dilə)*; *Put it into English Bunu ingilis dilinə tərcümə et/edin; How would you put it in French? Sən/Siz bunu fransızca necə deyərsən?/deyərsiniz?*; **10.** vermək *(sual)*; **to ~ many questions** çoxlu sual vermək; *He put so many questions that I couldn't answer them all O, o qədər çox sual verdi ki, mən onların hamısına cavab verə bilmədim*; **11.** irəli sürmək; təklif etmək; **12. (to)** *k.t.* cütləşdirmək *(heyvanları)*; **11.** qoşmaq *(heyvanı)*; **to ~ a horse to a carriage** faytona at qoşmaq; **13.** *k.t.* əkmək, səpmək; *The land was put under /into tomato Torpaqda pomidor əkilmişdi*; **to ~ about 1)** yaymaq, hamıya bildirmək; **to ~ about a rumour** şayiə yaymaq; **2)** dövriyyəyə buraxmaq; **3)** istiqaməti dəyişmək; çevirmək, döndərmək; **4)** çevrilmək, dönmək; **to ~ aside 1)** təxirə salmaq, başqa vaxta keçirmək; yubatmaq; kənara qoymaq; **to ~ aside a book** kitabı kənara qoymaq; *məc.* rədd etmək; **2)** toplamaq, yığmaq; *He has put a good deal of money aside O xeyli pul yığıb/ toplayıb*; **3)** nəzərə almamaq, diqqət verməmək/yetirməmək; göz yummaq; **to ~ aside** ***one's*** **difficulties** çətinliklərinə göz yummaq; **4)** tullamaq, atmaq; **to ~ aside** ***one's*** **old clothes** köhnə paltarlarını atmaq/tullamaq; **to ~ away 1)** yığmaq, götürmək, yığışdırmaq; **to ~ away** ***one's*** **clothes** paltarlarını yığışdırmaq; **2)** imtina etmək, əl çəkmək *(fikirdən)*; *He put away all ideas of becoming a lawyer O, hüquqşünas olmaq fikrindən əl çəkdi*; **3)** *d.d.* həbsxanaya/dustaqxanaya salmaq; **to ~ back 1)** yerinə qoymaq; **2)** geri çəkmək; **to ~ back the hands of the clock** saatın əqrəblərini geri çəkmək; **3)** gecikdirmək, yubatmaq, ləngitmək; *They put back the reform for fifty years Onlar islahatı əlli il yubatdılar/ləngitdilər*; **4)** qayıtmaq, geri dönmək; **to ~ back to the shore** sahilə qayıtmaq; **to ~ down 1)** qoymaq *(yerə və s.)*; *He put down his burden O, yükünü yerə qoydu*; **2)** yatırmaq *(zorla)*; **to ~ down a revolt** qiyamı yatırmaq; **3)** susmağa məcbur etmək; **to ~ down gossip** şayiənin qabağını almaq; **4)** azaltmaq, aşağı salmaq; **to ~ down prices** qiymətləri azaltmaq/aşağı salmaq; **to ~ down** ***one's*** **expenditure** xərclərini azaltmaq; **5)** yazmaq, qeyd etmək; **to ~** ***smb.*** **down in the list** bir kəsi siyahıya yazmaq/daxil etmək; **to ~ forth 1)** cücərti vermək, qönçələmək; **to ~ forth flowers** çiçəkləmək, çiçək açmaq; **2)** açmaq; *The leaves are putting forth Yarpaqlar açılır*; **3)** dövriyyəyə buraxmaq; nəşr etdirmək, buraxmaq; **to ~ forth a new book** yeni kitab nəşr etmək/buraxmaq; **to ~ forward 1)** təklif etmək, irəli sürmək; **to ~ forward a new plan** yeni plan təklif etmək; **to ~ forward a new theory** yeni nəzəriyyə irəli sürmək; **to ~** ***smb.*** **forward for a decoration** bir kəsi mükafat almağa təklif etmək; **to ~ forward a candidate** bir kəsin namizədliyini irəli sürmək; **2)** irəli/ qabağa çəkmək; *The clock was put forward ten minutes Saatı on dəqiqə qabağa/irəli çəkdilər*; **to ~ in 1)** əlavə/ daxil etmək; **2)** vəzifəyə təyin etmək; *He was put in to manage the business Ona firmaya rəhbərlik etmək tapşırıldı*; **3)** vermək, təqdim etmək; **to ~ in a document** sənəd təqdim etmək; **4)** *d.d.* vaxt keçirmək; **to ~ in** ***one's*** **time reading** vaxtını oxumaqla keçirmək; **5)** dayanmaq, düşmək, qalmaq; *Here's a good inn, let's put in here for luncheon Budur burada yaxşı bir mehmanxana var, gəl/gəlin burada qəlyanaltı edək/səhər yeməyi yeyək*; **to ~ off 1)** təxirə salmaq, başqa vaxta keçirmək, yubatmaq; **to ~ off the meeting** iclası təxirə salmaq; **to ~ off a payment** ödəmənin vaxtını uzatmaq; *He is always putting things off O həmişə hər şeyi təxirə salır/yubadır*; **2)** vaz keçmək, daşınmaq; **to ~ off doubts and fears** şübhələri və qorxuları rədd etmək; **3)** yola düşmək; getmək, yollanmaq; **to ~ off on a long journey** uzun səyahətə getmək/çıxmaq; **4)** ikrah doğurmaq; *The mere smell of that cheese puts me off Sadəcə olaraq o pendirin iyi məndə ikrah doğurur*; **to ~ on 1)** geyindirmək; geymək; qoymaq *(papağı)*; **to ~ on** ***one's*** **coat/*one's* shoes** paltosunu/ayaqqabısını geyinmək; **2)** özünü ...qoymaq/ göstərmək; *He put on an air of innocence O özünü günahsız kimi göstərdi*; **3)** səhnəyə/tamaşaya qoymaq; **to ~ on a new play** tamaşaya yeni pyes qoymaq; **4)** artırmaq, əlavə etmək; **to ~ on speed** sürəti artırmaq; **to ~ on weight/flesh** kökəlmək; **5)** buraxmaq, qoşmaq, birləşdirmək; yandırmaq *(işığı, qazı)*; **to ~ on the light/the gas** işığı/qazı yandırmaq; **to ~ on the brake** əyləci basmaq, tormoz vermək; **to ~ out 1)** çıxartmaq, uzatmaq, dartıb/çəkib uzatmaq; **to ~ out** ***one's*** **tongue, to ~** ***one's*** **tongue out** dilini çıxartmaq; **to ~ out** ***one's*** **hand** əlini uzatmaq; **to ~** ***one's*** **head out of the window** başını pəncərədən bayıra çıxartmaq; **2)** asmaq; **to ~ out flags** bayraqlar asmaq; **to ~ linen out to dry** dəyişəkləri qurutmaq üçün asmaq; **3)** sərf etmək; **to ~ out** ***one's*** **strength** gücünü sərf etmək; **4)** söndürmək; **to ~ out the light** işığı söndürmək; **to ~ out a fire** yanğını söndürmək; **5)** burxutmaq; **to ~ out** ***one's*** **arm** qolunu burxutmaq; **6)** nəşr etmək; buraxmaq; *The publishers put out fifty new books last year Keçən il naşirlər əlli yeni kitab buraxdılar*; **7)** kənara vermək; **to ~ a baby out to a nurse** uşağı dayəyə vermək; **to ~ out** ***one's*** **washing** camaşırı/dəyişəyi camaşırxanaya vermək; **8)** zoğ vermək *(bitki haq.)*; **to ~ out of** qovmaq, qovalamaq; çıxartmaq; **to ~ out of doors** qapıdan qovmaq/qovalamaq; **to ~ out of the way** aradan götürmək *(öldürmək, həbsxanaya salmaq və s.)*; **to ~ over** təxirə salmaq, başqa vaxta keçirmək; *The consideration of the bill was put over to the next session Qanun layihəsinin müzakirəsi gələn mövsümə qədər taxirə salındı*; **to ~ through 1)** icra etmək, yerinə yetirmək, tamamlamaq, qurtarmaq; **to ~ a job through** işi qurtarmaq/ tamamlamaq; **2)** calaşdırmaq *(telefonla)*; *I want to be put through to the hotel Məni mehmanxana ilə calaşdır/calaşdırın*; **to ~ together 1)** bir yerə birləşdirmək/ bərkitmək; *The broken edges of the plate were put together with glue Boşqabın qırıq kənarları yapışqanla bir yerə birləşdirildi*; **2)** yığmaq *(mexanizmi)*; **to ~ up 1)** qaldırmaq; **to ~ up the sails** yelkənləri qaldırmaq; **to ~ up a flag** bayraq qaldırmaq; **to ~ up** ***one's*** **hands** əllərini qaldırmaq, təslim olmaq; *Put them up! d.d. Əllər yuxarı!* **2)** tikmək, yüksəltmək; **to ~ up a wall** divar tikmək; **3)** qaldırmaq *(qiyməti)*; **4)** satışa qoymaq, bir şeyi satmaq; *This house is put up for sale Bu ev satılır/satışa qoyulub*; **5)** bir kəsin namizədliyini irəli sürmək; öz namizədliyini irəli sürmək *(seçkidə iştirak etmək üçün)*; **6) (at)** düşmək, qalmaq; **to ~ at an inn** mehmanxanaya düşmək; **to ~ up at** ***smb.'s*** **place** bir kəsin evində qalmaq; **7)** sığınacaq vermək, qəbul etmək *(qonağı)*; *I can put you up for the night Mən sənə/sizə bir gecəlik sığınacaq verə bilərəm*; **8)** maliyyələşdirmək, pul qoymaq; *There are people that will put up money for things like that Belə işləri maliyyələşdirən adamlar var*; **to ~ up a fight 1)** dava salmaq; **2)** müqavimət göstərmək; **9) (with)** dözmək; barışmaq, razılaşmaq; **to ~ up with insults** təhqirlərə dözmək; *I can't put up with it any longer Mən buna artıq dözə bilmərəm; I can put up with anything Mən nəyə desən/desəniz dözərəm*; **10)** tamaşaya qoymaq; *Next year we shall put up "King Lear" Gələn il biz "Kral Lir"i tamaşaya qoyacağıq*; **11)** qablaşdırmaq, sarıyıb bağlamaq; **to ~ up in bales** tay bağlamaq; **12)** konservləşdirmək; **to ~ up peaches/ apricots/ plums** *etc.* şaftalı/ ərik/ gavalı konservləşdirmək;

◊ **to ~ to use** istifadə etmək, işlətmək; **to ~ right 1)** düzəltmək, qayırmaq, təmir etmək; **2)** doğru yola gətirmək/çəkmək; **to ~** ***smb.*** **right with** ***smb.*** bir kəsi bir kəsin gözündə doğrultmaq/ haqq qazandırmaq; **to ~** ***smb.*** **in the wrong** günahı bir kəsin boynuna qoymaq; **to ~ to rights** qayda yaratmaq, qaydaya salmaq; **to ~ heads together** bir yerə yığılıb məsləhətləşmək, bir yerdə müzakirə etmək; **to ~ on airs** iddia/təşəxxüs satmaq; özünü çəkmək/dartmaq, lovğalanmaq; **to ~ on airs and graces** naz etmək, özünü naza qoymaq/ əzib büzmək; iddia satmaq, lovğalanmaq; **to ~ on all sails 1)** *dən.* bütün yelkənləri açmaq; **2)** mümkün olan hər şeyi etmək, bütün tədbirləri görmək; **to ~** ***smb.*** **at his ease** bir kəsi sakitləşdirmək; **to ~ in hand** əl qatmaq, başlamaq; **to ~** ***one's*** **hand in/ into** ***one's*** **pocket** əlini cibinə salmaq; pul xərcləmək; **to ~ pen to paper** yazmağa başlamaq, qələmə əl atmaq; **to ~** ***one's*** **oar into** ***smb.'s*** **boat** başqasının işlərinə qarışmaq; *Never put off until tomorrow what you can do today at.söz.* ≅ *Bu günün işini sabaha qoyma; Put your hand no further than your sleeve will reach at. söz.* ≅ *Ayağını yorğanına görə uzat*

**putative** ['pju:tətɪv] *adj* **1.** güman/ təxmin/ ehtimal/fərz edilən, nəzərdə tutulan; **a ~ language** təxmin edilən dil; **2.** saxta, uydurma, yalançı; **his ~ parents** onun uydurma valideynləri

**putrefaction** [ˌpju:trɪˈfækʃn] *n* 1. çürümə, iylənmə, qoxuma; çürüklük; 2. mənəviyyat pozğunluğu, əxlaqi pozğunluq
**putrefy** [ˈpju:trɪfaɪ] *v (pt, pp* **-fied)** 1. çürümək, qoxumaq *(meyit haq.)*; 2. mənəviyyatca/ əxlaqca pozulmaq
**putrescence** [pju:ˈtresns] *n* 1. çürümə; iylənmə, qoxuma; çürüklük, üfunətlilik; 2. mənəviyyatca/əxlaqca pozulma
**putrescent** [pju:ˈtresnt] *adj* çürük, çürüyən, üfunətli; ~ **smell** çürük/üfunət iyi
**putrid** [ˈpju:trɪd] *adj* 1. çürük, çürümüş, qoxumuş; 2. üfunətli; **the ~ smell of rotting fish** xarab olan balığın üfunətli iyi; 3. xarab olmuş/edilmiş, korlanmış, pozulmuş; 4. iyrənc; çox pis; ~ **colour** iyrənc rəng/boya; ~ **weather** çox pis/iyrənc hava
**putridity** [pju:ˈtrɪdɪtɪ] *n* çürüntü, çürük şey, çürüklük, üfunətlilik
**putsch** [putʃ] *n* putç, üsyan, qiyam
**putty** [ˈpʌtɪ] *n* 1. mastika; 2. zamaska; şpaklyovka
**puzzle[1]** [ˈpʌzl] *n* 1. çətin sual, problem; çətin tapşırıq; 2. tapmaca; başsındırma; **to find answer to ~** tapmacaya cavab tapmaq
**puzzle[2]** [ˈpʌzl] *v* 1. çaşdırmaq, karıxdırmaq, çətinliyə /çətin vəziyyətə salmaq; *This question puzzles me Bu məsələ məni çətinliyə/ çıxılmaz vəziyyətə salır*; **to ~ *smb.* with a question** bir kəsi sualla çaşdırmaq /utandırmaq; 2. baş çatlatmaq /sındırmaq *(bir şey üstündə)*; *He puzzled his brains to find the answer O, cavab tapmaq üçün başını çatlatdı / sındırdı*; **to ~ out** başa düşmək, anlamaq, tapmaq *(tapmacanın cavabını)*; **to ~ out a mystery** sirri anlamaq/başa düşmək
**puzzlement** [ˈpʌzlmənt] *n* 1. qarıxma, çaşma, çaşıb qalma, utanma, sıxılma, karıxma; xəcalət çəkmə; 2. tapmaca; sirr; *The affair will long be a puzzlement Bu məsələ uzun müddət sirr olaraq qalacaq*
**puzzler** [ˈpʌzləʳ] *n* 1. çətin məsələ; 2. müəmmalı şəxsiyyət; 3. krossvord sevən adam
**pyjamas** [pəˈdʒa:məz] *n* pijama *(yataq və ya ev paltarı)*
**pyramid** [ˈpɪrəmɪd] *n* 1. *tar.* ehram *(qədim Misirdə fironların sərdabəsi)*; **the Pyramids** Misir ehramları; 2. *riyaz.* piramida *(həndəsi fiqur)*; 3. *id.* piramida *(bir-birinin çiyninə çıxmış adamlardan ibarət akrobatik və ya gimnastik fiqur)*
**pyramidal** [pɪˈræmɪdl] *adj pl* piramidaşəkilli, piramidaformalı, piramidavarı
**pyre** [paɪəʳ] *n* dəfn tonqalı *(bəzi ölkələrdə meyiti yandırmaq üçün çatılan)*
**pyrolater** [paɪˈrɔlətəʳ] *n* atəşpərəst
**pyrolator** [paɪˈrɔlətəʳ] *n* = **pyrolater**
**pyrolatry** [paɪˈrɔlətrɪ] *n* atəşpərəstlik
**pyrosis** [paɪˈrousɪs] *n tib.* pirozis, *(mədə/ürək qıcqırması)*
**python** [ˈpaɪθn] *n zool.* piton *(isti ölkələrdə yaşayan iri zəhərsiz ilan)*





**Q q** [kju:] *n (pl* **Q's, q's** [kju:z]) *ingilis əlifbasının 17-ci hərfi;*
◊ **to be / to stand on *one's* P's and Q's 1)** öz dediyinin üstündə durmaq; **2)** öz dediyini ölçüb biçmək, öz sözlərini götür-qoy etmək; **to mind *one's* P's and Q's** özünə/öz sözlərinə fikir vermək, ehtiyatı əldən verməmək /qoymamaq; **on the qt** [ˌkju:ˈti:] gizlicə, xəlvəti, məxfi
**Q-boat** [ˈkju:bout] *n* = **Q-ship**
**Q-ship** [ˈkju:ʃɪp] *n dən. tar.* qayıq əleyhinə duzaq / tələ gəmi
**qua** [kweɪ] *adv lat.* 1. nə qədər ki, indi ki; 2. sifətilə, kimi; *He spoke as a private person, and not qua judge O, hakim kimi yox, mülki şəxs kimi çıxış etdi*
**quack[1]** [kwæk] *n* I 1. qağıltı, vaqqıltı *(ördək səsi)*; 2. *d.d.* ördək
**quack** [kwæk] *n* II ara həkimi, türkəçarəçi; şarlatan, yalançı, cüvəllağı
**quack[2]** [kwæk] *adj* türkəçarə; ~ **remedy** türkəçarə davası / əlacı / dərmanı
**quack[3]** [kwæk] *v* I 1. qağıldamaq, vaqqıldamaq *(ördək haq.)*; 2. ağzını bədliyə açmaq; qırıldamaq; 3. naqqallıq etmək, çənə vurmaq, çərənləmək
**quack** [kwæk] *v* II 1. davacatla / ovsunla / cadu ilə/tilsimlə müalicə etmək; türkəçarəçiliklə məşğul olmaq; 2. şarlatanlıq/dələduzluq/fırıldaqçılıq etmək
**quack-doctor** [ˈkwækˌdɔktəʳ] *n* şarlatan həkim
**quackery** [ˈkwækərɪ] *n* ara həkimliyi, türkəçarəçilik; falçılıq
**quack-grass** [ˈkwækgra:s] *n bot.* ayrıq *(yemlik dənli bitki)*
**quad** [kwɔd] *n* I **quadrangle** *isminin qısa forması*
**quad** [kwɔd] *n* II **quadruplet** *isminin qısa forması*
**quadrangle** [ˈkwɔdræŋgl] *n* 1. dördbucaq; 2. dördbucaqlı həyət; 3. çargül bina/tikili
**quadrangular** [kwɔˈdræŋgjuləʳ] *adj* dördbucaqlı, çargül
**quadrant** [ˈkwɔdrənt] *n* 1. *riyaz.* kvadrant, dairənin dörddə bir hissəsi; 2. sektor
**quadrate[1]** [ˈkwɔdrɪt] *n* 1. kvadrat; düzbucaq; 2. *anat* kvadrat sümük
**quadrate[2]** [ˈkwɔdrɪt] *adj* 1. kvadratşəkilli, çargül; 2. *riyaz.* kvadrat
**quadrate[3]** [kwɔˈdreɪt] *v* 1. uyğunlaşdırmaq; uzlaşdırmaq; 2. uyğun olmaq; **to ~ to/ with facts** faktlara/həqiqətlərə uyğunlaşdırmaq; 3. kvadrat şəklinə salmaq
**quadratic** [kwəˈdrætɪk] *adj* 1. dördbucaqlı, çargül; 2. *riyaz.* kvadrat; ~ **equation** kvadrat tənlik $(x^2+2x-8=0)$
**quadrature** [ˈkwɔdrətʃə] *n* 1. *riyaz.* kvadratura; ~ **of the circle** çevrənin kvadraturası *(ayri çevrəli fiqurun özü böyüklükdə kvadrata çevrilməsi)*; 2. *astr.* planetin yer ilə Günəş arasındakı xəttə nisbətən düzbucaq altında aldığı vəziyyət
**quadrilateral[1]** [ˌkwɔdrɪˈlætrəl] *n riyaz.* dördbucaq/dördtərəfli fiqur
**quadrilateral[2]** [ˌkwɔdrɪˈlætrəl] *adj* dördbucaqlı, dördtərəfli
**quadrille** [kwəˈdrɪl] *n* kadril *(rəqs adı)*
**quadripartite** [ˌkwɔdrɪˈpa:taɪt] *adj* 1. dörd hissədən ibarət; dörd hissəyə ayrılmış; 2. dördtərəfli; ~ **treaty** dördtərəfli müqavilə
**quadripole** [ˈkwɔdrɪpoul] *n el.* dördqütb
**quadrisyllable** [ˌkwɔdrɪˈsɪləbl] *n* dördhecalı söz
**quadrivalent** [ˌkwɔdrɪˈveɪlənt] *adj kim.* dördvalentli
**quadroon** [kwɔˈdru:n] *n* kvarteron, mələz *(mulat qadından və ağ irqli kişidən törənmiş adam)*
**quadruped** [ˈkwɔdruped] *n* dördayaqlı heyvan
**quadrupedal** [kwɔˈdru:pɪdəl] *adj* 1. dördayaqlı; dördtərəfli; **a ~ alliance** dördtərəfli ittifaq; 2. dörd dəfə artırılmış; **to make ~ restitution** dəymiş ziyanı dördqat həcmdə ödəmək; ~ **of / to** dörd dəfə çox
**quadruple** [ˈkwɔdru:pl] *v* 1. dörd dəfə artırmaq; 2. dörd dəfə artmaq; *The number of the natives quadrupled that of the immigrants Yerli əhalinin sayı mühacirlərin sayından dörd dəfə artıq olmuşdur; He has quadrupled his income O öz gəlirini dörd dəfə artırıb; His income has quadrupled in the last four years Son dörd ildə onun gəliri dörd dəfə artıb*
**quadruplets** [ˈkwɔdruplɪts] *n pl* dördlük; dördüz, dörduşaq *(eyni vaxtda doğulan dörd əkiz uşaq)*
**quadruplicate[1]** [kwɔˈdru:plɪkɪt] *n* eyni dörd nüsxədən biri *(sənədin)*; **in ~** dörd nüsxədə; *pl* dörd eyni nüsxə
**quadruplicate[2]** [kwɔˈdru:plɪkeɪt] *v* 1. dörd dəfə artırmaq; dördə vurmaq; 2. dörd nüsxədə tərtib etmək
**quaff[1]** [kwa:f, kwæf] *n* bir nəfəsə/uduma içmə; **to drink off *one's* glass at a single ~** qədəhini bir uduma içmək

**quaff²** [kwa:f] *v* bir nəfəsə / uduma içmək, iri qurtumla içmək; qədəhi dibinə qədər içmək *(həm.* **~ off/out/up)**; **to ~ oneself into insensibility** huşunu itirənə qədər içmək

**quaffer** [ˈkwa:fəʳ] *n* əyyaş, içki düşkünü

**quagga** [ˈkwægə] *n zool.* kvaqa, zebr *(dərisi zolaqlı vəhşi at)*

**quaggy** [ˈkwægı] *adj* 1. bataqlıq, batlaq; 2. bataqlıq sahədən axan *(su)*; 3. süst, ölüvay, ləng *(adam)*

**quagmire** [ˈkwægmaıəʳ] *n* 1. bataqlıq; 2. çətin vəziyyət

**Quai d'Orsay** [ˈkeıdɔ:ˈseı] *n* 1. Fransa Xarici İşlər Nazirliyi; 2. Fransanın xarici siyasəti

**quail¹** [kweıl] *n* 1. *zool.* bildirçin; 2. boz kəklik; 3. *amer. d.d.* tələbə *(qız)*; 4. qarımış qız

**quail²** [kweıl] *v* qorxmaq, qorxaqlıq göstərmək, çəkinmək, acizliyini boynuna almaq; titrəmək, əsmək; *His heart quailed Onu qorxu bürüdü, Onun ürəyi əsdi*; **to ~ in the face of danger** təhlükə qarşısında qorxaqlıq göstərmək; *His eyes quailed before her angry looks O, qızın acıqlı baxışlarına tab gətirə bilmədi*

**quail-call** [ˈkweılkɔ:l] *n* = **quail-pipe**

**quail-pipe** [ˈkweılpaıp] *n* sümsü, gigi *(quşları çağırmaq üçün tütək)*

**quaint** [kweınt] *adj* qəribə, qəşəng; qeyri-adi, müəmmalı; təmtəraqlı, orijinal, qədim; *American visitors to Azerbaijan admire our customs Azərbaycana gələn amerikalı qonaqlar bizim adətlərimizə heyran olurlar*; **~ furniture** qədim dəbli/ qəribə mebel; *She wears quaint dresses O, orijinal paltarlar geyinir*; **~ way of speaking** qəribə danışıq tərzi; **a man of ~ humour** qəribə/qeyri-adi yumorlu adam

**quake¹** [kweık] *n* 1. titrəmə, əsmə, titrəyiş, lərzə; 2. *d.d.* zəlzələ

**quake²** [kweık] *v* titrəmək, əsmək, yırğalanmaq, silkələnmək, yellənmək; *The ground quaked under his feet Onun ayaqlarının altında yer titrədi; He was quaking with fear O, qorxudan əsirdi*; **to make** *smb.'s* **heart ~** bir kəsi vahiməyə / qorxuya salmaq, bir kəsin ürəyini içinə salmaq, qorxutmaq

**Quaker** [ˈkweıkəʳ] *n* kvaker *(Xristian Dostlar Cəmiyyətinin üzvü olan şəxs)*; **~ City** *d.d.* kvakerlər şəhəri *(Filadelfiya)*

**quaking-aspen** [ˈkweıkıŋ.æspən] *n bot.* ağcaqovaq *(ağac)*

**quaking-grass** [ˈkweıkıŋ.gra:s] *n bot.* titrək *(ot)*

**quaky** [ˈkweıkı] *adj* 1. laxlayan, tərpənən, möhkəm olmayan; 2. titrək, titrəyən, əsən

**qualification** [.kwɔlıfıˈkeıʃn] *n* 1. məhdudlaşdırma, məhdudiyyət, dəyişiklik, modifikasiya; **the ~ of** *smb.'s* **privilege** bir kəsin imtiyazlarının məhdudlaşdırılması; 2. şərt, təshih, düzəliş, qeyd-şərt; *You can accept his statement with certain qualification Sən/Siz onun mülahizəsini müəyyən təshihlə qəbul edə bilərsən/bilərsiniz*; **to assert** *smth.* **without any ~** bir şeyi qeyd-şərtsiz təsdiq etmək; **to grant** *smth.* **with one ~** nəyəsə bir şərtlə razı olmaq; 3. ixtisas, hazırlıq, hazırlıq dərəcəsi; yararlılıq; **to receive doctor's ~** həkimlik ixtisası almaq; **to have ~ for an occupation** bir işlə məşğul olmağa hüququ olmaq; **to have ~ for military service** hərbi xidmətə yararlı olmaq; 4. senz; **tax ~** vergi senzi; **literacy ~** təhsil senzi; **residential ~** məskunlaşma/oturaq həyat senzi

**qualified** [ˈkwɔlıfaıd] *adj* 1. münasib, uyğun gələn, yararlı, müvafiq olan; **~ for a post** hər hansı bir yer üçün münasib; **~ for an office** hər hansı bir vəzifə üçün yararlı; **well ~ for** *one's* **position** tutduğu vəzifəyə tamamilə uyğun / müvafiq olan; 2. səriştəli, səlahiyyətli, bilikli; **a fully ~ doctor** çox / olduqca səriştəli / bilikli həkim; 3. məhdud edilmiş, məhdudlaşdırılmış, qeyd-şərtlə edilmiş; **to give** *smth.* *one's* **~ approval** bir şeyi qismən təqdir etmək; **to take a word in a ~ sense** hər hansı bir sözü dar mənada işlətmək; 4. müəyyən olunmuş, təsbit edilmiş; **~ majority** müəyyən olunmuş çoxluq

**qualify** [ˈkwɔlıfaı] *v (pp, pt* **-fied)** 1. müəyyən bir fəaliyyət üçün ixtisaslaşmaq, ixtisas/təhsil vermək, öyrətmək; *He's qualified for this post O, bu vəzifə / yer üçün ixtisaslaşıb; He's not qualified to teach French Ona fransız dili tədris etmək ixtisası verilməyib*; 2. hər hansı bir fəaliyyət üçün hazırlanmaq, hər hansı bir sahədə mütəxəssis olmağa hazırlanmaq, ixtisas almaq/ qazanmaq; **to ~ as a doctor** həkim ixtisası almaq; **to ~ for the rank of Captain** kapitan rütbəsi almaq üçün hazırlıq keçmək; 3. səlahiyyət vermək; **to ~** *smb.* **as a voter** bir kəsə seçici səlahiyyəti vermək, bir kəsi seçicilər siyahısına daxil etmək; 4. səlahiyyət qazanmaq, hüquq əldə etmək; **to ~ for the vote** səsvermə hüququ almaq; **to ~ for the entry** *id.* yarışda iştirak etmək hüququ əldə etmək; seçmə yarışlarında iştirak etmək; 5. azaltmaq, yumşaltmaq, yüngülləşdirmək; *məc.* soyutmaq; **to ~** *one's* **anger** hirsini basmaq, acığını soyutmaq; **to ~ the severity of a judgement** cəzanı yüngülləşdirmək; hökmü yumşaltmaq; 6. qatmaq, qarışdırmaq; **to ~ coffee with cognac** kofeyə konyak qatmaq; 7. qiymətləndirmək, hesab etmək; **to ~ an opinion as erroneous** fikri səhv hesab etmək; 8. *qram.* təyin etmək; *Adjectives qualify nouns Sifətlər isimləri təyin edirlər*

**qualitative** [ˈkwɔlıtətıv] *adj* keyfiyyət; *kim.* **~ analysis** keyfiyyət analizi; *qram.* **~ adjectives** keyfiyyət bildirən sifətlər



**quality** [ˈkwɔlıtı] *n (pl* **-ties)** 1. keyfiyyət, növ; **goods of first-rate ~** yüksək keyfiyyətli mal; *Poor quality goods won't sell easily Pis keyfiyyətli mal asanlıqla satılmaz; We aim at quality rather than quantity Bizim məqsədimiz kəmiyyətcə yox, keyfiyyətcə yaxşı mal istehsal etməkdir*; **transition from quantity to ~** kəmiyyətin keyfiyyətə keçməsi; *We manufacture goods of various qualities Biz müxtəlif keyfiyyətli mal istehsal edirik; He is a man with many good qualities O, çoxlu müsbət keyfiyyətlərə malik adamdır*; 2. xüsusiyyət; xassə, əlamət; *One quality of pine-wood is that it can be sawn easily Şam ağacının bir xüsusiyyəti odur ki, o asanlıqla kəsilir; He has the quality of inspiring confidence Onda inam yaratmaq xüsusiyyəti var*; **to possess healing qualities** müalicə xassələrinə malik olmaq; **to show** *one's* **~** özünü biruzə vermək;

◊ **in (the) ~ of** sifətilə; **to act in (the) ~ of agent** müvəkkil olmaq; **to be present in (the) ~ of friend** dost kimi iştirak etmək

**qualm** [kwa:m] *n* 1. ürək bulanması, öyümə, ürəkbulanma; *Qualms spoilt his appetite during the first few days of the voyage Dəniz səyahətinin ilk bir neçə günü ərzində ürəkbulanmaları onun iştahasını pozdu*; 2. mütərəddidlik, şübhə, şəkk, tərəddüd; **~ of conscience** vicdan əzabı; *He felt no qualms about borrowing money from his friends O öz dostlarından utanmadan/həya etmədən borc pul aldı*

**qualmish** [ˈkwa:mıʃ] *adj* 1. ürəkbulanması hiss edən; 2. vicdan əzabı çəkən

**quandary** [ˈkwɔndərı] *n* çətin vəziyyət, çətinlik; çaşıb qalma; **to be in a ~ about what to do next** bundan sonra nə etmək barədə çaşıb qalmaq/çətinlik çəkmək; **to be put in a ~** çətin vəziyyətə qoyulmaq

**quanta** [ˈkwɔntə] *n* **quantum** *isminin cəmi*

**quantify** [ˈkwɔntıfaı] *v (pt, pp* **-ied)** kəmiyyəti müəyyən etmək

**quantitative** [ˈkwɔntıtətıv] *adj* 1. kəmiyyət; **~ analysis** *kim.* kəmiyyət analizi; 2. sayıla bilən, kəmiyyəti müəyyən oluna bilən

**quantity** [ˈkwɔntıtı] *n* 1. miqdar, say, kəmiyyət; *I prefer quality to quantity Mən keyfiyyəti kəmiyyətdən üstün tuturam; There is a small quantity left Kiçik bir miqdar qalır*; 2. həcm, ölçü; **spatial ~** sahənin ölçüsü; **the ~ of a surface** səthin həcmi; **the ~ of a line** xəttin uzunluğu; 3. *(həm. pl)* böyük/çoxlu/külli miqdar; **by quantities** külli miqdarda; **flowers in quantities** külli miqdarda güllər; *He collected a quantity of old pictures O, külli miqdarda qədim şəkillər kolleksiyası topladı; We've had quantities of rain this summer Bu yay bizdə həddindən artıq yağış olub*; 4. *riyaz.* kəmiyyət, miqdar; **incommensurable quantities** ortaq ölçüsüz kəmiyyətlər; **unknown ~** 1) məchul kəmiyyət (x); 2) müəmmalı şəxs/olay /şey; 5. *fon.* səsin uzunluğu/ miqdarı; **the ~ of a vowel** saitin uzunluğu; 6. *mus.* səsin nisbi uzunluğu; 7.: **~ production** kütləvi istehsal

**quantum** [ˈkwɔntəm] *n (pl* **quanta)** *lat.* 1. miqdar, say; 2. cəm; 3. hissə, pay; 4. lazım olan/arzu edilən miqdar; 5. *fiz.* kvant; **~ of energy** kvant enerjisi; **light ~** işıq kvantı/ hissəciyi, foton; **~ theory** *fiz.* kvant nəzəriyyəsi

**quarantine¹** [ˈkwɔrənti:n] *n* 1. karantin, təcrid etmə; **a vessel held in ~** karantin qoyulmuş gəmi; **to be in ~ for a week** bir həftəlik karantində olmaq; *How long will my dog be kept in quarantine Mənim itim nə qədər karantində saxlanılacaq?*; 2. izolyator; **to put** *smb.* **in / under ~** bir kəsi izolyatora qoymaq; 3. *hüq.* qırx günlük karantin; 4.: **~ flag** sarı rəngli karantin bayrağı; **~ inspection** karantin müayinəsi; **~ station** karantin məntəqəsi

**quarantine²** [ˈkwɔrənti:n] *v* 1. karantin qoymaq, karantində saxlamaq; **~d because of yellow fever** sarı qızdırmaya görə karantində saxlanılmış; 2. təcrid etmək, təkləmək; **to ~ an agressor nation** təcavüzkar dövləti təcrid etmək / təkləmək

**quarrel¹** [ˈkwɔrəl] *n* 1 1. dalaşma, qovğa, dava, çəkişmə, ixtilaf, nifaq, ədavət; **a ~ with** *smb.* bir kəslə dava; **to be at ~** dalaşmaq; **to avoid a ~** davadan qaçmaq; **to make up / to patch up a ~** barışmaq, qovğaya son qoymaq; *They made up their quarrel Onlar dava-dalaşa son qoydular; He is always fighting other people's quarrels Başqalarının davasını həmişə o çəkir, O həmişə başqalarının sosial ədalət əldə etmələrinə kömək edir*; 2. səbəb, dava /ədavət üçün bəhanə; *I have no quarrel with him Mən ondan incimirəm, Mənim onunla heç bir ədavətim yoxdur*; **to seek/to pick a ~ with** *smb.* bir kəslə dava üçün bəhanə axtarmaq; 3. *d.d* şikayət, məhkəməyə şikayətlə müraciət etmə; 4. *d.d* məhkəmə çəkişməsi;

◊ **to find ~ in a straw** hər şeyə mız qoymaq/irad tutmaq; **to take up another's ~** mübahisədə bir kəsin tərəfini saxlamaq; **to fight another person's ~ for him** bir kəsə haqlı olduğunu sübut etməkdə yardımçı olmaq, ədalətin təntənəsinə nail olmaqla bir kəsə kömək etmək

**quarrel** [ˈkwɔrəl] *n* II *tex.* şüşəkəsən almaz, şüşə doğramaq üçün almaz

**quarrel²** [ˈkwɔrəl] *v* 1. dalaşmaq, savaşmaq; söyüşmək, sözləşmək, çəkişmək, deyişmək; **to ~ with *smb.* for/ about *smth.*** bir şey üstündə kiminləsə sözləşmək; *The thieves quarrelled with one another about how to divide the loot Qənimətı necə bölmək üstündə oğrular biri-birilə dalaşdılar*; 2. mübahisə etmək / aparmaq; bəhanə axtarmaq; **to ~ with the way *smth.* is done** bir şeyin icra üsuluna / necə edildiyinə etiraz etmək; *I would find difficulty to quarrel with this statement Bu müddəa ilə razılaşmamaq mənim üçün çətin olar; It is not the fact of examinations I'm quarrelling with; it's the way they're conducted Mən imtahanların aparılması faktına qarşı yox, onun aparılması üsuluna qarşı mübarizə aparıram*;

◊ **to ~ with *one's* bread and butter** öz çörəyini kəsmək; *A bad workman quarrells with his tools ≅ Çolaq atın kor nalbəndi olar, Oynamıram, yerim dardır*

**quarry¹** [ˈkwɔrı] *n* I 1. daş karxanası, karxana; 2. *məc.* mənbə *(məlumatın, xəbərin və s.)*

**quarry** [ˈkwɔrı] *n* II 1. qənimət *(ovda)*; təqib edilən ov *(heyvan)*; 2. *məc.* nəzərdə tutulmuş qurban

**quarry²** [ˈkwɔrı] *v* 1. daş çıxarmaq/kəsmək *(karxanada)*; çıxarmaq, istehsal etmək; **to ~ limestone** əhəngdaşı çıxarmaq /istehsal etmək; 2. *məc.* araşdırmaq; axtarmaq; **to ~ in old manuscripts** köhnə/qədim əlyazmalarını araşdırmaq; **to ~ treasures from old books** qədim kitablarda qiymətli məlumatlar axtarmaq

**quart** [kwɔ:t] *n* 1. kvart *(İngiltərədə = 1,14 l, Amerikada = 0,95 l)*; 2. bir kvart tutumlu/həmin ölçüdə qab; **to drink a ~ of beer** bir kvart pivə içmək;

◊ **to try to put a ~ into a pint pot** mümkün olmayan bir işi görməyə çalışmaq

**quarter** [ˈkwɔ:təʳ] *n* I 1. çərək, çətvər, dörddə bir hissə; **a ~ of a mile** milin dörddə biri/ çətvəri; *We've come a quarter of the distance now Biz indi mənzilin dörddə birini gəlmişik*; **a mile and a ~** bir mil bir çətvər; **to divide *smth.* into a ~** bir şeyi dörd hissəyə bölmək; *Divide the apple into four quarters Almanı dörd hissəyə böl /bölün*; 2. saatın dörddə biri, on beş dəqiqə; **a ~ to one** saat birə on beş dəqiqə qamış; **a ~ past one** ikiyə on beş dəqiqə işləmiş; *Some clocks strike the quarters Bəzi saatlar hər on beş dəqiqədən bir vururlar*; 3. kvartal, üçaylıq; **to pay for *smth.* at the end of each ~** hər kvartalın sonunda bir şeyin haqqını ödəmək; **to owe several ~s' rent** bir neçə kvartalın kirə haqqını borclu olmaq; **a whole ~'s pay** üçaylıq əməkhaqqı; 4. rüb *(məktəbdə)*; **Lady day / Spring ~** ilin bir rübü *(25 martdan 24 iyuna kimi)*; **Midsummer / Summer ~** ilin bir rübü *(24 iyundan 29 sentyabra kimi)*; **Michaelmas /Autumn ~** ilin bir rübü *(29 sentyabrdan 25 dekabra kimi)*; **Christmas/Winter ~** ilin bir rübü *(25 dekabrdan 25 marta kimi)*; *He had a quarter at French O, bir rüb fransız dili öyrəndi*; 5. *amer.* dolların dörddə biri, 25 sent; **to be a ~ cheaper** 25 sent ucuz olmaq; 25 sent dəyərində sikkə/pul; 6. *aşp.* dörd şaqqa olunmuş cəmdəyin bir şaqqası; **a ~ of beef** mal cəmdəyinin dörddə bir hissəsi/çətvəri; 7. dördüzlü tir/dirək; 8. çəkmənin/ayaqqabının dalı

**quarter** [ˈkwɔ:təʳ] *n* II 1. kvartal, məhəllə, sahə; rayon; **residential ~** yaşayış sahəsi / məhəlləsi; **in the southern ~** şəhərin cənub hissəsində / məhəlləsində; **in the industrial ~ of the city** şəhərin sənaye rayonunda; 2. dünyanın cəhətləri, dünyanın / kainatın bir hissəsi / tərəfi; **the four ~s of the globe** yer kürəsinin dörd cəhəti / tərəfi; *From what quarter does the wind blow? Külək hansı tərəfdən əsir?*; 3. yer, tərəf, guşə; **a distant ~** uzaq guşə/yer; **from every ~** hər tərəfdən; *As his father was penniless, he could expect no help from that quarter Atası tamamilə kasıb olduğundan o, o tərəfdən heç bir kömək gözləyə bilməzdi; They gathered from all quarters of Europe Onlar Avropanın hər tərəfindən gəlib bir yerə yığışdılar*; 4. dairələr, mühit; **in the highest ~s** yuxarı / yüksək dairələrdə; *The suggestion did not find favour in the highest quarters Təklif yuxarı / hakim dairələrdə himayə olunmadı / təqdir edilmədi*

**quarter** [ˈkwɔ:təʳ] *n* III 1. aman, rəhm, mərhəmət; **to ask for ~** aman diləmək; **to give ~** aman vermək, mərhəmət etmək; *No quarter was asked for and none given Nə aman diləyən oldu, nə də aman verən*; **to receive ~** aman verilmək; 2. qəbul; rəftar; **to give *smb.* fair ~** bir kəsi yaxşı qəbul etmək; **to meet ill ~ from *smb.*** bir kəs tərəfindən pis qarşılanmaq;

◊ **to have a bad ~ of an hour** ağır dəqiqələr yaşamaq / keçirmək; **to beat up *smb.'s* ~s** çəkinmədən / təklifsiz bir kəsə baş çəkmək; **fifth ~** öldürülmüş heyvanın dərisi və piyi; **to keep a ~** özünü səs-küylü / çılğın aparmaq

**quarter²** [ˈkwɔ:təʳ] *v* I 1. bölmək; dörd bərabər hissəyə bölmək; **to ~ an apple** almanı dörd bərabər hissəyə bölmək; 2. şaqqalamaq *(qədimdə: müqəssirin qollarını, ayaqlarını və başını vurmaqdan ibarət edam cəzası)*; *He was condemned to be hanged, drawn and quartered O, dara çəkilib şaqqalanaraq edam olunmaq cəza*-



*sına məhkum edildi*; 3. *astr.* yeni fazaya girmək *(ay haq.)*

**quarter** [ˈkwɔ:təʳ] *v* II 1. mənzillərə yerləşdirmək, yerbəyer etmək; **to ~ troops in the village** ordunu kənddəki mənzillərdə yerləşdirmək; **to ~ on / upon /with *smb.*** hərbi qulluqçunu bir kəsin mənzilində yerləşdirmək; 2. bir kəsin evinə düşmək; **to ~ oneself on / with *smb.*** bir kəsin evinə düşmək, bir kəsin evində yaşamaq

**quarter-back** [ˈkwɔ:təbæk] *n* müdafiəçi *(futbolda)*

**quarter-day** [ˈkwɔ:tədeı] *n* kvartalın başlandığı gün *(İngiltərədə ödəniş müddətləri: 25 mart, 24 iyun, 29 sentyabr, 25 dekabr)*

**quarter-deck** [ˈkwɔ:tədek] *n dən.* 1. şkans *(hərbi gəmilərin göyərtəsində rəsmi təşrifat keçirilən yer)*; 2. *dən.* yut *(gəmidə göyərtənin dal tərəfi)*; 3. zabit heyəti

**quarter-final** [ˈkwɔ:təˈfaınl] *n id.* dörddə bir final oyunu; **to enter the ~s** dörddə bir finala çıxmaq

**quarterly¹** [ˈkwɔ:təlı] *n* üç aydan bir çıxan jurnal

**quarterly²** [ˈkwɔ:təlı] *adj* 1. üçaylıq, kvartala aid; **~ meetings** üçaydan bir keçirilən yığıncaqlar; **~ payments** üçaylıq əməkhaqqı / ödəmə; 2. dörd sahəyə bölünmüş

**quarterly³** [ˈkwɔ:təlı] *adv* üç aydan / hər kvartaldan bir; *Meetings are held quarterly Yığıncaq hər üç aydan bir keçirilir*

**quartermaster** [ˈkwɔ:tə,ma:stəʳ] *n hərb.* kvartirmeyster, intendant *(orduda və ya qoşun hissələrində təsərrüfat işlərinə baxan şəxs)*

**quarters** [ˈkwɔ:təz] *n (fellə cəmdə işlənir)* 1. ev, otaq, mənzil, yer, iqamətgah; **summer /winter ~** yay/qış evləri; **the King's ~** Kral iqamətgahı; **to change *one's* ~** mənzilini dəyişmək; **to get / to obtain ~ at a hotel** mehmanxanada yer, nömrə almaq; *We found excellent quarters at a small inn Biz balaca bir qonaq evində əla / gözəl nömrələr tapdıq; I took up quarters with a friend Mən dostumla bir yer / otaq götürdüm*; 2. *hərb.* kazarma; *All troops are to return to quarters at once Bütün qoşun dərhal kazarmalara qayıtmalıdır*; 3. *dən.* döyüş cədvəli ilə müəyyən olunmuş yer; **at ~** döyüş cədvəlinə uyğun olaraq; **to beat / to call to ~** "toplan" siqnalı vermək; **to sound off ~** bitmə siqnalı vermək;

◊ **to come to close ~** 1) əlbəyaxa döyüşə girmək; 2) təsadüfən üz-üzə gəlmək

**quartet(te)** [kwɔ:ˈtet] *n mus.* 1. kvartet; 2. *d.d.* *dörd nəfərdən ibarət qrup*

**quarto** [ˈkwɔ:tou] *n (pl -os [-ouz]) poliqr.* kvarto, format, **in-~** inkvarto *(çap vərəqinin dörddə birinə bərabər kitab formatı)*

**quartz** [ˈkwɔ:ts] *n min.* kvars; **a ~ clock** kvars saatı

**quartz-lamp** [ˈkwɔ:tsˈlæmp] *n* ultrabənövşəyi lampa

**quash** [kwɔʃ] *v* 1. *hüq.* ləğv etmək; geri götürmək; **to ~ charges against *smb.*** bir kəsə qarşı ittihamları geri götürmək; **to ~ a judgement** məhkəmə hökmünü ləğv etmək; 2. məhv/yox etmək; *məc.* boğmaq; **to ~ a person** bir adamı məhv etmək; **to ~ *one's* feeling** hissi boğmaq

**quasi¹** [ˈkwa:zı] *adv lat.* guya, sanki, elə bil, guya ki, deyəsən; **~ humour** uydurma yumor

**quasi²** [ˈkwa:zı] *pref.* kvazi *(bir sıra mürəkkəb sözlərin əvvəlində "guya", "yarım" mənasını ifadə edən komponent*; **quasi-official position** yarımrəsmi vəzifə; **quasi-seriously** guya ciddi*)*

**quasi-conductor** [ˈkwa:zıkənˈdʌktəʳ] *n fiz.* yarımkeçirici, yarımnaqil, pis keçirici

**quasi-contract** [ˈkwa:zıˈkɔntrækt] *n hüq.* müqaviləyə uyğun hüquqi münasibətlər

**quarter-centenary** [ˈkwætəsenˈtı:nərı] *n* dörd yüz illik; 400 illik yubiley; **the ~ celebrations in 1964 of Shakespeare's birth** 1964-cü ildə Şekspirin anadan olmasının 400 illik yubiley şənlikləri

**quatrain** [ˈkwɔtreın] *n ədəb.* rübai, dördlük

**quaver¹** [ˈkweıvəʳ] *n* 1. səsin titrəməsi /titrəyişi; 2. zümzümə; zəngulə, cəh-cəh; 3. *mus.* səkkizinci not

**quaver²** [ˈkweıvəʳ] *v* 1. titrəmək, əsmək, ehtizaza gəlmək; 2. zəngulə vurmaq; zümzümə etmək; *She quavered (out/ forth) her little song O, kiçik mahnısını /nağməsini zümzümə ilə oxudu*; **in a ~ing voice** titrək səslə

**quavery** [ˈkweıvərı] *adj* titrək, titrəyən

**quay** [ki:] *n* 1. gəminin yanalması üçün körpü, sahil bəndi; 2. yanalma, yanlaşdırıb bağlama *(gəmini)*

**quayage** [ˈki:ıdʒ] *n dən.* 1. sahil bəndində / körpüdə dayanmaq üçün ödənilən rüsum; 2. yanalma körpüsünün uzunluğu

**quean** [kwi:n] *n d.d.* qəhbə, fahişə

**queasy** [ˈkwi:zı] *adj* 1. zəif *(mədə)*; 2. ürəkbulandıran; **~ mixture** ürəkbulandıran mikstura; 3. ürəkbulanmaya həssas; kefsizlik hiss edən; 4. zərif, incə, nazik; **to have a ~ conscience** vicdanlı olmaq; 5. vasvası, iradcıl, müşkülpəsənd

**queen¹** [kwi:n] *n* 1. kraliça, şahzadə; **Queen Anne (1702-1714)** kraliça/şahzadə Anna (1702-1714); **Queen of England** İngiltərə kraliçası/şahzadəsi; **the Queen Consort** hökmranlıq edən kralın arvadı; **~ dowager** dul kraliça; **~ mother** hökmranlıq edən hökmdarın dul anası; 2. ilahə, məlikə; **Q. of heaven / of the night** gecə ilahəsi, Ay; **Q. of love** məhəbbət/sevgi /eşq ilahəsi, Venera; **~ of beauty** gözəllik ila-

həsi, Kleopatra; **Q. of glory/of grace/of women** Məryəm ana; ~ **of flowers** qızılgül; 3. inci, gözəllik, bəzək, dilbər, yaraşıq; **Venice, the ~ of the Adriatic** Venesiya – Adriatik dənizinin incisi/bəzəyi; 4. sevgili, canan; ~ **of all hearts / society** ürəkçalan qadın/qız; afəti-canan, dilbər; 5. dama, qız *(kart oyununda)*; ~ **of hearts** qırmızı toxmaq dama /qız *(kart oyununda)*; 6. *şahm.* ferz, vəzir; 7. ana *(arıçıqa / arı ailəsində və s.)*

◊ *Queen Anne is dead* ≅ *Amerikanı kəşf etdin!; When Queen Anne was alive* ≅ *Qədim əyyamda;* **in the reign of ~ Dick** heç vaxt / ömründə ola bilməz

**queen²** [kwi:n] *v* 1. tac qoymaq; 2. kraliça olmaq, hökmranlıq etmək; 3. özünü kraliça kimi aparmaq;

**queen-apple** ['kwi:n.æpl] *n* ranet *(alma növü)*

**queen-bee** ['kwi:n'bi:] *n* ana arı

**queen-cell** ['kwi:n'sel] *n* ana yuva *(arı təknəsində)*

**queenhood** ['kwi:nhud] *n* şahzadəlik dövrü

**queening** ['kwi:nıŋ] *n* = **queen-apple**

**Queen of the meadow(s)** ['kwi:nəvðə medou(z)] *n bot.* allaf

**queenship** ['kwi:nʃıp] *n* şahzadə / kraliça rütbəsi

**queen's ware** ['kwi:nzweə'] *n* minalanmış açıq sarı rəngli saxsı qablar

**queer¹** [kwıə'] *n sl.* homoseksualist

**queer²** [kwıə'] *adj* 1. qəribə, əcaib, çox qəribə, qeyri-adi; **a ~ way of talking** qəribə danışıq tərzi; **a ~ story / look / dress** qeyri-adi hekayə /baxış / libas; **to speak in a ~ language** qəribə /başqalarından fərqlənən bir dildə danışmaq; **a ~ sort of fellow** qəribə oğlan; **a ~ bird** *d.d.* əcaib/tuhaf adam; *There is something queer about him O, bir növ qəribə adamdır, Onun bir növ qəribəliyi var*; 2. şübhəli, şübhə doğuran; ~ **transaction** şübhəli sövdə; *The matter looks queer Bu iş şübhəli görünür*; **to move in ~ company** şübhəli yoldaşlarla danışmaq/vaxt keçirmək/oturub durmaq; 3. kefsiz, zəif, başıgicəllənən; **to feel very ~** özünü çox pis hiss etmək; 4. *d.d.* saxta, əldəqayırma; ~ **money** saxta pul; **to shove the ~ money** saxta pul soxuşdurmaq *(xəlvəti)*;

◊ **in Q Street** 1) çətin vəziyyətdə; fəlakətdə, müsibətdə; 2) borc içində; *He is queer in the head Onun başı çatmır*

**queer³** ['kwıə] *v* 1. korlamaq, zay etmək; **to ~ oneself with *smb.*** kiminsə qarşısında çətin/ pis vəziyyətə düşmək / pərt olmaq; 2. aldatmaq, tovlamaq, kələk / fırıldaq gəlmək;

◊ **to ~ *smb.'s* pitch, to ~ the pitch for *smb.*** bir kəsə qarşı əclaflıq/nacinslik/alçaqlıq etmək; bir kəsə quyu qazmaq

**quell** [kwel] *v* 1. *məc.* boğmaq, yatırmaq, susdurmaq; 2. sakitləşdirmək, yüngülləşdirmək, azaltmaq *(ağrını)*; **to ~ *one's* fears** hirsini basmaq; **to ~ pain** ağrını azaltmaq

**quench¹** [kwentʃ] *v* 1. söndürmək, keçirmək; **to ~ a fire** yanğını söndürmək; **to ~ a light** işığı söndürmək; 2. su vermək *(polada)*; *məc.* möhkəmləndirmək; **to ~ steel** polada su vermək; 3. *məc.* boğmaq, qırmaq, son qoymaq, məhv etmək; **to ~ *one's* desire** arzusunu məhv etmək; **to ~ *one's* love** sevgisini boğmaq; **to ~ hope** ümidini qırmaq; 4. söndürmək, yatırmaq; **to ~ *one's* thirst** susuzluğunu yatırmaq; 5. susdurmaq, ağzını yummaq

**quenching** ['kwentʃıŋ] *n* 1. sulama, tovlama, su vermə *(polada)*; 2. *tex.* söndürmə, keçirmə

**quenchless** ['kwentʃlıs] *adj* sönməyən, sönməz, əbədi; **a ~ flame** əbədi məşəl

**quern** [kwə:n] *n* əl dəyirmanı *(kofe, istiot və s. üçün)*

**quern-stone** ['kwə:nstoun] *n* dəyirman daşı

**querulous** ['kwerulǝs] *adj* 1. daim şikayətlənən, narazı; deyingən; tezacıqlanan, tündməcaz, əsəbi; **a ~ person** tündməcaz adam; ~ **by nature** xasiyyətcə /təbiətən deyingən; 2. yanıqlı, kədərli; ~ **voice** yanıqlı səs; ~ **tone** kədərli ton

**query¹** ['kwıərı] *n* 1. sual, məsələ; **to raise a ~** məsələ qaldırmaq; *Query, where are we to find the funds? Soruşula bilər, biz vəsaiti haradan tapmalıyıq?*; 2. şübhə, şəkk; *I have a query about her sincerity Onun səmimiliyinə mənim şübhəm var*; 3. sual işarəsi (?)

**query²** ['kwıərı] *v* 1. xəbər tutmaq/almaq, soruşmaq/məlumat almaq; soruşub / öyrənib bilmək; ağzını aramaq, söz çəkmək, öyrənməyə çalışmaq; **to ~ *smb.* about *smb./smth.*** bir kəsdən bir kəs / şey haqqında soruşub öyrənmək; **to ~ the amount of *smth.*** bir şeyin miqdarını öyrənməyə çalışmaq; 2. şübhə etmək, şəkk gətirmək, şübhələnmək, inanmamaq; **to ~ an answer** cavaba şübhə etmək / inanmamaq; *I query whether his word can be relied on Görəsən, onun sözünə etibar etmək olarmı*; **to ~ a person's instructions** bir kəsin göstərişinə şəkk gətirmək / inanmamaq; 3. sual işarəsi qoymaq

**quest¹** [kwest] *n* axtarma; axtarılma; **the ~ for gold** qızıl axtarma; **in ~ of *smb./smth.*** bir kəsi / şeyi axtarma; **in ~ of adventure** macəra sorağında / axtarışında; *He went off in quest of food O, yemək axtarmaq üçün çıxıb getdi*

**quest²** [kwest] *v* axtarmaq, axtarıb tapmaq; **to ~ about looking for *smth.*** bir şeyi tapmaq üçün hər tərəfi gəzib axtarmaq; **to ~ for ov / yem** axtarmaq *(it və digər heyvanlar haq.)*



**question¹** ['kwestʃən] *n* 1. sual; məsələ; **direct / indirect / oblique ~** *qram.* vasitəsiz /vasitəli nitqdə sual; **alternative ~** alternativ sual; **a ticklish ~** incə məsələ; **to put /to ask ~s** suallar vermək; **to answer ~s** suallara cavab vermək; **to complicate /to entangle a ~** məsələni mürəkkəbləşdirmək/ dolaşdırmaq; **to clear/to clarify/to brighten a ~** məsələni aydınlaşdırmaq, məsələyə aydınlıq gətirmək; *Ask me no question Mənə heç bir sual vermə/verməyin*; **to bombard *smb.* with ~s, to fire ~s at *smb.*** bir kəsə suallar yağdırmaq, bir kəsi suala tutmaq; *He shied away from a question O, pərt olub suala cavab vermədi; It has often been a question with me whether I can afford it Mən tez-tez özözümdən soruşmuşam, əcəba, mən bunu özümə rəva görə bilərəmmi*; 2. problem, müşkül məsələ, müzakirə olunan iş / məsələ; **economic /social ~s** iqtisadi/sosial məsələlər; **the ~ of the day** çox aktual məsələ; **a difficult ~ to decide** çətin həll olunan məsələ; **to raise / to open / to bring up a ~** məsələ qaldırmaq; **to speak to the ~** əsas məsələdən/mətləbdən danışmaq; **to deviate /to depart/to digress from a ~** məsələdən yayınmaq/uzaqlaşmaq/kənara çıxmaq; **to treat / to solve a ~** məsələyə baxmaq, məsələni həll etmək; **to touch upon a ~** məsələyə toxunmaq; **to set the ~ at rest** məsələni yoluna qoymaq; **to come into ~** müzakirə obyekti olmaq; **to go into the ~** məsələyə diqqət yetirmək, məsələ ilə məşğul olmaq; **to have nothing to do with the ~, to be foreign to the ~** məsələyə dəxli olmamaq; *This is out of question Bu xüsusda söhbət ola bilməz; The question is... Məsələ bundadır ki...; That is not the question Məsələ bunda deyil;* 3. şübhə, şəkk, çətinlik *(məsələnin həllində)*, etiraz; **beyond/out of /past/without ~** əlbəttə, şübhəsiz; **to call *smth.* in ~** bir şeyə şəkk etmək, bir şeydən şübhələnmək; **to make no ~ of *smth.*** bir şeyə şübhə etməmək; **to make a ~ of the news** məlumatın doğruluğuna şübhə etmək; *There is no question but that he will succeed Şübhə yoxdur ki, o, uğur qazanacaq; There is no question but that he is honest Onun düzlüyünə söz ola bilməz, Şübhəsiz ki, o, düz / təmiz adamdır; A question arose between them Onların arasında fikir ayrılığı baş verib/ əmələ gəlib*; 4. istintaq, sorğu-sual; **to call *smb.* in ~** 1) bir kəsi sorğu-suala tutmaq /istintaq etmək; 2) bir kəsi məhkəməyə vermək;

◊ *Question! Mətləbdən uzaqlaşma! / uzaqlaşmayın! (yığıncaq sədrinin çıxış edənlərə müraciəti)*; **in ~** müzakirə olunan, haqqında danışılan; *Where is the man in question? Haqqında danışılan adam haradadır?*; **64 dollar ~** ən çətin məsələ; ≅ *Ask no questions and you will be told no lies Sual vermə / verməyin, sənə / sizə yalan danışmasınlar*

**question²** ['kwestʃən] *v* 1. dindirmək, sorğu-sual/ istintaq etmək; **to ~ a witness** şahidi dindirmək; *He was questioned by the police O, polis tərəfindən dindirildi*; 2. şübhələnmək, şübhə etmək, şübhə altına almaq; **to ~ a decision** qərarın düzgünlüyünə şübhə etmək; **to ~ *smb.'s* right to *smth.*** bir kəsin bir şeyə hüququnu / haqqını şübhə altına almaq; *He never questioned her being twenty-one Onun iyirmi bir yaşında olmasına şübhələnmək onun heç vaxt ağlına gəlməyib; I question whether he is right Onun haqlı olmasına mən əmin deyiləm; I question whether his proposal will be approved Onun təklifinin bəyənilməsinə mən şübhə edirəm*; 3. soruşmaq, sual etmək/vermək; *They questioned the Conservative candidate on his views Onlar mühafizəkarlar partiyasının namizədinə onun fikir və düşüncələri haqqında suallar verdilər*; 4.: *arx.* **to ~ with *smb.*** bir kəslə mübahisə etmək/diskussiya aparmaq

**questionable** ['kwestʃənəbl] *adj* 1. şübhəli, etibarsız; ~ **statement** qəribə / etibarsız bəyanat; 2. şübhəli, şübhə doğuran, pis ad qazanmış; ~ **conduct** pis / yaramaz davranış

**questionary** ['kwestʃənərı] *n* anket

**question-mark** ['kwestʃənma:k] *n* sual işarəsi

**questionnaire** [.kwestʃə'neə] *n fr.* anket, sorğu vərəqəsi

**queue¹** [kju:] *n* 1. növbə; **to stand in a ~** növbəyə dayanmaq /durmaq; **to jump the ~** növbəsiz keçmək; 2. qatar, cərgə, sıra; *A queue of cars was held up by the traffic lights İşıqfor maşın qatarını saxladı*; 3. hörük, saç; hörükcük *(parikdə)*

**queue²** [kju:] *v* 1. növbəyə dayanmaq / durmaq; **to ~ up for a tram** tramvaya minmək üçün növbəyə durmaq / dayanmaq; 2. saç / hörük hörmək

**quibble¹** ['kwıbl] *n* 1. kalambur, cinas; söz oyunu; 2. sofizm, səfsəfə; 3. fənd, kələk, hiylə

**quibble²** ['kwıbl] *v* 1. məsələnin mahiyyətindən uzaqlaşmaq; kalambur vasitəsilə birbaşa cavabdan boyun qaçırmaq/yayınmaq; 2. *arx.* söz güləşdirmək, bir şeyi zarafata salmaq

**quick¹** [kwık] *adj* 1. cəld, iti, tez, yeyin, sürətli; ~ **movement** cəld hərəkət; **a ~ train** sürətli qatar; ~ **glance** iti nəzər, cəld baxış; ~ **luncheon** atüstü səhər yeməyi; ~ **journey** qısa səfər; **to be ~** cəld / becid olmaq, tələsmək; *Be quick! Cəld/Tez ol/olun!; Do be quick! Tələs görək, Bir az tələs!*; ~ **succession of events** hadisələ-

rin süratlə dəyişməsi /bir-birini əvəz etməsi; *The flashes of lightning came in quick succession Şimşək ara vermədən dalbadal çaxırdı; She is as quick as a lightning O, od-alovdur*. **2.** zirək, çevik, diribaş, diri, qıvraq, fəal; **a ~ workman** zirək / diribaş işçi; **~ at/ about work** işdə zirək / qıvraq; **~ of foot** ayaqdan zirək / çevik; **to be ~ at / about work** işdə zirək / çevik olmaq; *How quick you were about it? Sən / Siz onu nə tez etdin? / etdiniz?*; **to be ~ at *smth.*** bir şeyi cəld / məharətlə etmək; **to be ~ in *one's* decisions** çevik qərar qəbul etmək, qərar qəbul etməkdə çevik olmaq; **3.** fərasətli, düşüncəli, zəkalı, zirək, ayıq; **a ~ child** fərasətli uşaq; **not very ~** qabiliyyətsiz, inkişaf etməmiş *(uşaq haq.)*; **~ to learn** zəkalı; iti, yaxşı inkişaf etmiş, həssas, incədən incəni seçən, mahir; **~ sight** iti göz; yaxşı görmə qabiliyyəti; **~ ear** həssas qulaq, incədən incəni seçən eşitmə qabiliyyəti; *He has a quick remembrance of it O, bunu yaxşı xatırlayır*; **a ~ mind/wit** iti ağıl, tez anlama/ dərk etmə qabiliyyəti, fəhmlilik; **~ understanding** anlaq, fərasət, fəhm, dərrakə, tez başa düşmə; **a man of ~ observation** diqqətli / hər şeyə fikir verən adam; **5.** güclü, dərin *(hiss haq.)*; **to feel a ~ repentance** ciddi / böyük / dərin peşmançılıq keçirmək, peşman olmaq, dərin təəssüf hissi keçirmək; **~ resentment** böyük ədavət/narazılıq; **6.** tez/dərhal əksüləməl göstərən/reaksiya verən, həssas; **~ to take offence** dəymədüşər, küsəyən, tez inciyən; **~ to anger** tez acıqlanan / hirslənən, tündməcaz; **~ to sympathize** həssas; **7.** kəskin, sərt, birdən və güclü, çox; **~ turn** sərt dönüş / döngə; **~ thrust** qəfil güclü zərbə; **~ ascent /descent** sərt yoxuş/eniş; **8.** canlı, yaşıl; **~ fence/hedge** canlı/yaşıl çəpər;

◊ **to have a ~ one / drink** ayaqüstü içmək/vurmaq *(spirtli içkini)*; *We just have time for a quick one Bizim yalnız ayaqüstü içmək üçün vaxtımız var*; **~ with child** hamilə; *She is quick with life down to her finger-tips Onda həyat qaynayır*; **to cut *one's* finger-nail to the ~** dırnağını dibdən tutmaq/kəsmək; **to sting / to touch/to wound /to cut to the ~** zəif damarından tutmaq; **to paint one to the ~** naturadan/orijinaldan çəkmək; **as ~ as lightning / as a flash** ildırım sürətilə / kimi, ani, çox iti;

◊ *Quick at meat, quick at work Yeməkdə də zirək, işdə də*; ≅ *Dilini görə dilçəyi də var*

**quick²** [kwık] *adv* tez, iti, yeyin, cəld, sürətlə, olduqca; *Please come quick! Lütfən tez gəl! /gəlin!; You're walking too quick for me Sən / Siz çox yeyin gedirsən / gedirsiniz, mən elə yeyin gedə bilmərəm; He wants to get rich quick O, tez varlanmaq istəyir*

**quick-bread** ['kwık'bred] *n* **1.** xəmrəsiz çörək; **2.** şit / duzsuz xəmirdən bişirilmiş peçenye

**quick-change** ['kwıktʃeındʒ] *n* aktyor-transformator *(kiçik bir pyesdə bir neçə rolu ifa edən aktyor)*

**quicken** [kwıkən] *v* **1.** sürətləndirmək, sürətini artırmaq, yeyinləşdirmək; *We quickened our pace Biz addımlarımızı yeyinlətdik*; **2.** sürətlənmək, sürəti artmaq, yeyinlənmək; *Our pace quickened Addımlarımız sürətləndi*; **3.** canlandırmaq, oyatmaq, stimul yaratmaq, şövqləndirmək; **to ~ *smb.'s* interest in *smth.*** kimdəsə bir şeyə maraq oyatmaq; *Good literature quickens the imagination Yaxşı ədəbiyyat təxəyyülü canlandırır*; **4.** dirilmək, tərpənmək, hərəkət etməyə başlamaq *(bətindəki uşaq haq.)*; *The child quickened in her womb O, ilk dəfə dölün hərəkətini hiss etdi, Uşaq ana bətnində tərpənməyə başladı; She is quickening with child Uşaq onun bətnində tərpənir; His pulse quickened Onun nəbzi sürətlə döyünməyə başladı*

**quick-firer** ['kwık.faıərə'] *n hərb.* tezaçılan silah / top

**quick-firing** ['kwık.faırıŋ] *adj hərb.* tezaçılan; **~ ammunition** gilizlə doldurulan döyüş sursatı

**quick-freeze** ['kwıkfri:z] *v* **1.** tez/ani olaraq dondurmaq *(ərzağı)*; **2.** tez donmaq, buz bağlamaq *(ərzaq haq.)*

**quickground** ['kwıkgraund] *n* = **quicksand**

**quickie** ['kwıkı] *n d.d.* xaltura; tələsik / əlüstü buraxılmış zay məhsul

**quicklime** ['kwıklaım] *n* sönməmiş əhəng

**quickly** ['kwıklı] *adv* tez, iti, yeyin, cəld, sürətlə, dərhal, ani olaraq; tələsik, tez tələsik, yubanmadan; *She speaks too quickly O, çox sürətlə danışır; He quickly changed his clothes O cəld paltarını dəyişdi*

**quickmarch** ['kwık'ma:tʃ] *int. hərb.* sürətli addımla marş; *Quickmarch! Addımla irəli! (hərbi komanda)*

**quickness** ['kwıknıs] *n* **1.** tezlik, yeyinlik, itilik, sürət; **2.** zirəklik, fərasətlilik, ayıqlıq; **3.** həssaslıq, incəlik, mahirlik; **4.** tündməcazlıq, tez acıqlanma, əsəbilik

**quicksand** ['kwıksænd] *n* ağır qum; üzəyən lil, tərpənən qum; yumşaq susaxlayan süxur

**quickset** ['kwıkset] *n* **1.** çəpər kimi əkilmiş yemişan qələmləri / çilikləri; **2.** canlı / yaşıl çəpər

**quick-sighted** ['kwık'saıtıd] *adj* **1.** iti/yaxşı görmə qabiliyyəti olan; **2.** *məc.* gözüaçıq, açıqgözlü, bəsirətli

**quicksilver** ['kwıksılvə'] *n kim.* civə; **to have ~ in *one's* veins** çox zirək / qıvraq olmaq

**quicktempered** ['kwık'tempəd] *adj* tezacıqlanan, tezhirslənən, tündməcaz, əsəbi



**quickwitted** ['kwık'wıtıd] *adj* **1.** zirək, diribaş, gözüaçıq; **2.** hazırcavab, ağıllı, fərasətli

**quid¹** [kwıd] *n* I *çeynəmək üçün preslənmiş tütün tikəsi*

**quid** [kwıd] *n* II *d.d. (cəmdə dəyişmir)* funt sterlinq; *He earns fifty quid (=£50) a week O, həftədə 50 funt sterlinq qazanır*

**quid²** [kwıd] *v* **1.** preslənmiş tütünü çeynəmək; **2.** saqqız çeynəmək

**quiddity** ['kwıdıtı] *n* **1.** mahiyyət, məğz, mətləb; **2.** fitnə, intriqa, fırıldaq, kələk

**quidnunc** ['kwıdnʌŋk] *n* daima sual verən adam; xəbərçi, sözgəzdirən, qeybətçi, dedi-qoduçu

**quid pro quo** [.kwıdprou'kwou] *n lat.* **1.** əvəzəbədəl, qulluğa görə qulluq, *Əl ilə yuyar, əl də üzü*, kompensasiya; **2.** bir şeyi səhv salmaq zəminində yaranmış anlaşılmazlıq

**quiescence** [kwaı'esns] *n* sakitlik, dinclik, rahatlıq; həkərətsizlik, durğunluq

**quiescent** [kwaı'esnt] *adj* sakit, fəaliyyətsiz, sükunət halında olan; **~ load** statik yük / ağırlıq

**quiet¹** [kwaıət] *n* **1.** sakitlik, səssizlik, sükut; **in the ~ of the night** gecənin sükutunda; **2.** rahatlıq, dinclik, əmin-amanlıq, asudəlik; **the ~ of the mind** qəlb/ürək rahatlığı; **to have an hour's ~** bir saat rahatlıq əldə etmək, bir saat dincəlmək; **a few hours of ~** bir neçə saatın dincliyi; **to live in peace and ~** dinc və əmin-amanlıqda yaşamaq; *The country enjoyed many years of quiet after the war Müharibədən sonra ölkə uzun illər əmin-amanlıq içində yaşadı*

**quiet²** [kwaıət] *adj* **1.** sakit, səssiz, xəfif; **~ wind** xəfif külək; **~ footsteps** sakit / səssiz addımlar; **~ evening** sakit axşam; **~ street** sakit / səssiz küçə; **to be ~** sakit olmaq; *Be quiet! Sakit ol!/olun!; Keep quiet! Səs salma! / salmayın!; Everything is quiet after 10 o'clock Saat 10-dan sonra hər şey sükuta qərq olur; The patient was at last quiet Nəhayət xəstə sakitləşdi; The restless boy was quiet now Narahat oğlan indi sakit oldu/kiridi*; **2.** hərəkətsiz, sabit, durğun, lal *(su haq.)*; **~ air** durğun hava; **~ river** sakit / lal axan çay; **3.** dinc, rahat; asudə, tələşsiz; **~ sleep** rahat yuxu; *I want to be quiet after my journey Səfərdən sonra dincəlmək / rahat olmaq istəyirəm*; **4.** cansız, yeknəsəq, cansıxıcı, darıxdırıcı, məhzun; *He finds life in the country too quiet Kənddə həyat onun üçün çox yeknəsəq / darıxdırıcı görünür*; **5.** şit olmayan, gözoxşayan; **~ colours** gözoxşayan rənglər; **a ~ style of dress** şit olmayan don/paltar; **6.** sadə, təmtəraqsız; təvazökar; **~ wedding** təmtəraqsız toy; **a ~ gathering of friends** dostların sadə/təmtəraqsız görüşü; **a very ~ man** çox təvazökar/sadə adam; **nice ~ people** gözəl təvazökar insanlar; **7.** gizli, məxfi; **to keep *smth.* ~** bir şeyi gizlətmək / gizlicə saxlamaq / ört-basdır etmək; **on the ~** gizlicə/məxfi olaraq; **to have a drink on the ~** gizlicə içki içmək;

◊ **as ~ as a mouse** dinməz-söyləməz, laldinməz

**quiet³** [kwaıət] *v* **1.** sakitləşdirmək, sakit etmək, susdurmaq; **to ~ a fretful child** əsəbi uşağı sakitləşdirmək; **to ~ a clamour** səs-küyü yatırmaq; **2.** sakitləşmək, sakit olmaq, susmaq, kirimək; *The city quieted down after the political disturbances Siyasi çaxnaşmalardan sonra şəhər sakitləşdi*

**quieten** ['kwaıətən] *v* **1.** sakitləşdirmək, sakit etmək, susdurmaq; **to ~ *smb.'s* fears** bir kəsi sakitləşdirmək, bir kəsə ürək-dirək vermək; **2.** sakitləşmək, sakit olmaq, susmaq, kirimək

**quieter** ['kwaıətə'] *n* **1.** sakitləşdirici, sakitləşdirən, təskinedici; **2.** sakitləşdirici vasitə/dərman /əlac

**quietism** ['kwaıətızm] *n* **1.** kviyetizm *(həyata mistik baxış, fəlsəfi mistik nəzəriyyə)*; **2.** ürək rahatlığı; rahatlıq

**quietly** ['kwaıətlı] *adv* yavaşca, astaca; rahatca, sakitcə, dinc, aramla, arxayınca, tələşsiz

**quietness** ['kwaıətnıs] *n* sakitlik, səssizlik; rahatlıq; sükut; dinclik, əmin-amanlıq, asudəlik

**quietude** ['kwaıətju:d] *n* sakitlik, səssizlik; rahatlıq, dinclik, əmin-amanlıq

**quietus** [kwaı'ı:təs] *n* ölüm, vəfat, əcəl; **to get *one's* ~** ölmək, vəfat etmək; **to make *one's* ~** özünü öldürmək, intihar etmək; **to give *smb.* his ~** bir kəsin həyatına son qoymaq

**quiff** [kwıf] *n* zülf, tel

**quill¹** [kwıl] *n* **1.** quş ləleyi; **2.** qələm kimi istifadə edilən lələk; **a ~ pen** lələk qələm; **to carry a good ~** yaxşı xətti olmaq; **3.** oxlu kirpinin iynəsi / oxu; **4.** qarovul mili *(balıq tilovunda)*; **5.** dişqurdalayan; **6.** sümsü, tütək, ney *(qamışdan)*

**quill²** [kwıl] *v* büzmələmək, büzmək *(paltarı)*; burmaq, qat-qat eləmək

**quilt¹** [kwılt] *n* **1.** sırınmış yorğan; **2.** pike *(qabarıq naxışlı parça)*

**quilt²** [kwılt] *v* **1.** sırımaq; **2.** tikmək; **to ~ money in *one's* belt** pulu qurşağına tikmək

**quina** ['ki:nə] *n* **1.** kinə ağacının qabığı; **2.** = **quinine**

**quinary** ['kwaınərı] *adj* beşlik; **~ number** beşə bölünən rəqəm

**quince** [kwıns] *n bot.* heyva

**quincentenary¹** [.kwınsen'tı:nərı] *n* 500 illik; 500 illik yubiley

**quincentenary²** [.kwınsen'tı:nərı] *adj* 500 illik, 500 il çəkən

**quinine** [kwı'ni:n, 'kwaınaın] *n kim.* kinə *(dərman)*

**quinsy** ['kwınzı] *n tib.* kəskin irinli tonzillit, badamətrafı abses, angina, boğazgəlməsi
**quintal** ['kwıntl] *n* sentner *(100 kq)*; kvintal=100-112 lb *(İngiltərədə = 50,8 kq, Amerikada = 45,36 kq)*
**quintessence** [kwın'tesns] *n* kvintessensiya *(bir şeyin əsas mahiyyəti, cövhəri)*, mahiyyət, məğz, əsas; ~ **of virtue** comərdliyin / ləyaqətin əsası
**quintet** [kwın'tet] *n mus.* **1**. kvintet *(beş səs və ya beş çalğı üçün yazılmış musiqi əsəri)*; **2**. belə əsərin ifası; **3**. beş nəfərdən ibarət çalğıçı və ya müğənni dəstəsi
**quintuplet** ['kwıntju:plət, kwın'tu:plıt] *n* **1**. beş əşyadan ibarət dəst; **2**. *pl* beş əkiz uşaq; **3**. beş əkizlərdən biri
**quip**[1] [kwıp] *n* **1**. istehzalı /rişxəndli /kinayəli mülahizə, istehzalı/kinayəli irad; **2**. müdrik kəlam; **3**. sofizm, səfrəst; söz oynatma, fənd
**quip**[2] [kwıp] *v* rişxənd etmək, kinayə ilə danışmaq, acı söz demək, ələ salmaq
**quire** [kwaıər] *n* I 24 vərəqdən ibarət bir top kağız; **to sell paper by the** ~ kağızı top ilə satmaq
**quire** [kwaıər] *n* II = **choir** II
**quirk**[1] [kwə:k] *n* I bir kəsə / bir şeyə xas olan qəribəlik /vərdiş; *One of his quirks is sleeping with his stocks on Onun qəribəliklərindən / vərdişlərindən biri corabla yatmasıdır*
**quirk** [kwə:k] *n* II **1**. kalambur, cinas; söz oyunu; **2**. hiylə, kələk, biclik, fənd; **3**. quyruq, burum *(yazıda, imzada, hərfdə, naxışda)*
**quirk**[2] [kwə:k] *v* **1**. cinasla danışmaq; **2**. ələ salmaq, masqara/ istehza/ rişxənd etmək, lağa qoymaq; **3**. *məc.* zəhərləmək, acılamaq, sancmaq
**quisle** ['kwızl] *v* öz vətənini satmaq, satqınlıq etmək, satqın olmaq
**quisling** [kwızlıŋ] *n* satqın, xain, dönük
**quit**[1] [kwıt] *n amer.* işdən çıxarılma
**quit**[2] [kwıt] *adj* azad, sərbəst; bir şeydən yaxasını/canını qurtarmış; *We are well quit of him Ondan canımızı yaxşı qurtardıq*; **to get ~ of *one's* debts** borclarından qurtarmaq; **to get ~ of an uneasy fear** əzici / ağır qorxudan / vahimədən / dəhşətdən canını qurtarmaq; **to be ~ for *smth.*** bir şeydən canını qurtarmaq / xilas olmaq
**quit**[2] [kwıt] *v* **(-tt-)**; *(pt, pp* **-ted** [-ıd]), *amer, d.d.* **quit) 1**. tərk etmək, çıxıb getmək; *I quitted him in disgust Mən dilxor/pərt halda onu tərk etdim*; **to ~ *one's* family** ailəsini atıb getmək / tərk etmək; **to ~ the house** evi tərk etmək, başqa yerə köçmək; *We've had notice to quit Bizi xəbərdar ediblər ki, kirayə etdiyimiz evi boşaldaq*; **to ~ *one's* office** işdən çıxmaq, işi tərk etmək; *I've given my secretary notice to quit Mən katibəmə xəbərdarlıq etmişəm ki, işi tərk etsin / işdən çıxsın*; **to ~ the army** tərxis edilmək, ordudan buraxılmaq; **2**. atmaq, qurtarmaq, tullamaq; **to ~ work when the siren sounds** sirenanın siqnalı ilə işi qurtarmaq; *Quit grumbling! Qurtar/Qurtarın donquldanmağı; Quit that! Qurtar / Qurtarın onu!, Eləmə / Eləməyin!*; **to ~ smoking** papirosu/papiros çəkməyi atmaq; **to ~ school** məktəbi atmaq; **3**. əldən vermək, buraxmaq; **to ~ hold of *smth.*** bir şeyi əldən buraxmaq; **4**. *d.d.* əvəzini vermək / çıxmaq; **to ~ love with the hate** məhəbbətin əvəzini nifrətlə çıxmaq; **5**. *d.d.* özünü aparmaq; *Quit yourselves like men Özünü / Özünüzü kişi kimi apar / aparın*
**quite** [kwaıt] *adv* **1**. tamamilə, tamam-kamal, büsbütün; *He has quite recovered from his illness Onun xəstəliyi tamamilə sağalıb, O tamamilə sağalıb; I quite understand Mən çox gözəl anlayıram / başa düşürəm; I quite agree with you Mən səninlə / sizinlə tamamilə razıyam; She was quite alone O tamamilə tək / yalqız idi; That man is not quite acceptable O kişi tamamilə məqbul deyil/naməqbuldur; That's quite another story Bu tamamilə başqa məsələdir*; **2**. demək olar ki, təxminən, xeyli, olduqca çox / az, qismən, kifayət / müəyyən dərəcəyə qədər; **~ a good player** çox yaxşı oyunçu; *It's quite warm to-day Bu gün xeyli / kifayət qədər istidir; He was quite polite O çox/ olduqca nəzakətli idi; It took quite a long time O, xeyli vaxt apardı; She quite likes him, but not enough to marry him Onun müəyyən qədər oğlandan xoşu gəlir, ancaq bu evlənmək üçün kifayət deyil*; **~ a few / a lot / a number / a little** *d.d.* olduqca çox; **3**. həqiqətən, doğrudan da, həqiqətdə; *They are both quite young Onların hər ikisi həqiqətən gəncdirlər; She is quite a beauty O, doğrudan da gözəldir; I believe they're quite happy together Mən inanıram ki, onlar birlikdə doğrudan da xoşbəxtdirlər*; **4**. nəzakətli etiraf *(razılıq bildirmək üçün işlədilir)*: *–It's a difficult situation, –Quite (so)! –Bu, çətin vəziyyətdir, –Tamamilə doğrudur, Bəli doğrudan da!; –I'm so sorry; I'm afraid I've taken your seat, –Oh, that's quite all right –Üzr istəyirəm; Deyəsən sənin / sizin yerini / yerinizi tutmuşam. -Narahat olma / olmayın, heç nə olmaz / heç eybi yoxdur; Oh, quite! Əlbəttə!; Yes, quite! Quite so! Sözsüz, Şübzəsiz; Çox yaxşı, Düzdür!*;
◊ *It's quite the thing İndi bu dəbdədir; These Italian dress materials are quite the thing this summer Bu italyan parçaları bu yay dəbdədirlər*
**quits** [kwıts] *adj;* **to be ~ with *smb.*** bir kəslə haqq-hesab çəkib qurtarmaq / haqq-hesabı çürütmək, hesablaşmaq, əvəz-əvəz olmaq, üzülüşmək; *We are quits now İndi biz kvitik, Biz haqq-hesabı çürütdük; I'll be quits with him Mən onunla haqq-hesabı çürüdəcəyəm*;
◊ *Call it quits İndi hər şey bərabərdir / tarazdır (Mübarizəni, davanı qurtarmaq olar)*; **to cry ~** barışığa gəlmək, razılaşmaq; **double or ~** bəxtə-bəxt qərar *(püşk atmaqla borclunun iki dəfə artıq, yaxud heç nə ödəməməsi haqqında qərara gəlmə)*
**quittance** ['kwıtəns] *n* **1**. qəbz, iltizam; **2**. azad olma *(öhdəçilikdən, təəhhüddən, ödəmədən, borcdan və s.)*; **3**. borcu/ əvəzini ödəmə
**quiver**[1] ['kwıvər] *n* I ox qabı, oxluq;
◊ **to have an arrow left in *one's* ~** hər hansı bir şeyi ehtiyat üçün saxlamaq
**quiver** ['kwıvər] *n* II **1**. titrəmə, əsmə, lərzə; **not a ~ of an eyelid** gözün qırpılmaması, tükün də tərpənməməsi *(heç bir şeydən çəkinməmə /qorxmama)*; **2**. səsin titrəməsi
**quiver**[2] ['kwıvər] *adj arx.* diribaş, çevik, diri, zirək, qıvraq
**quiver**[3] ['kwıvər] *v* **1**. titrəmək, əsmək, zağ-zağ əsmək, lərzəyə gəlmək/düşmək; **to ~ with fear /cold** qorxudan / soyuqdan əsmək/titrəmək; *His hands/lips quivered Onun əlləri / dodaqları əsdi*; **2**. titrətmək, əsdirmək, lərzəyə salmaq; **3**. arabir yelləmək *(qanadları); The moth quivered its wings Pərvanə qanadlarını arabir yellədirdi*
**qui vive** [.ki:'vi:v] *n fr. hərb. Gələn kimdir?! (növbətçinin xəbərdarlığı)*;
◊ **on the ~** ayıq / sayıq / hazır olma
**Quixote** ['kwıksət] *n ədəb.* Don-Kixot *(həm. məc.)*
**quixotic** [kwık'sɔtık] *adj* müdrik, düşüncəli, öz mənafeyini güdməyən, don Kixota xas/aid olan
**quixotically** [kwık'sɔtıkəlı] *adv* müdrikcəsinə, düşüncə ilə, öz mənafeyini güdmədən, donkixot kimi, donkixotcasına
**quixotism, quixotry** ['kwıksətızm, 'kwıksətrı] *n* donkixotluq
**quiz**[1] [kwız] *n* I **1**. istehza, masqara, ələ salma, lağa qoyma, rişxənd, adamoynatma; zarafat, hənək; **2**. istehzaçı, rişxəndçi, masqaraçı, adamoynadan
**quiz** [kwız] *n* II *amer.* **1**. ümumi sorğu *(dərsdə)*; əvvəlcədən hazırlıq görmədən aparılan şifahi və ya yazılı yoxlama/ test; **2**. viktorina, silsilə suallar; ~ **program** radioviktorina; ~ **show** televiktorina
**quiz**[2] [kwız] *v* I **1**. ələ salmaq, masqara / rişxənd etmək, lağa qoymaq; zarafat etmək, hənəklənmək; **2**. rişxəndlə baxmaq
**quiz** [kwız] *v* II *amer.* **1**. yoxlama sorğu aparmaq *(sinifdə, dərsdə)*; əvvəlcədən hazırlıq görmədən şifahi və ya yazılı yoxlama /test aparmaq; **2**. soruşub bilmək / öyrənmək
**quizmaster** ['kwız.ma:stər] *n* radio və ya televiktorina aparıcısı
**quizzical** ['kwızıkəl] *adj* **1**. istehzalı, zarafatyana, cinləndirici; **a ~ smile** istehzalı gülüş; **~ glance** istehzalı nəzər / baxış; **~ remark** zarafatyana məzəmmət; **2**. bir qədər qəribə /əcaib; komik, məzəli, gülməli; **3**. *amer.* anlaşılmaz, heyrət doğuran; **~ look** anlaşılmaz / heyrət doğuran baxış
**quizzing-glass** ['kwızıŋ'gla:s] *n* monokl *(təkgözlü eynək)*
**quod**[1] [kwɔd] *n sl.* həbsxana, qoduqluq
**quod**[2] [kwɔd] *v* həbs etmək, qoduqluğa atmaq /basmaq
**quoin** [k(w)ɔın] *n* **1**. künc daşı; **2**. binanın küncü; **3**. *tex.* paz, çiv
**quoit**[1] [kɔıt, kwɔıt] *n id.* halqa, hədəfə atılan halqa
**quoit**[2] [kɔıt, kwɔıt] *v id.* halqanı hədəfə atmaq
**quoits** [kɔıts] *n id.* halqanı hədəfə atma *(oyun)*
**quondam** ['kwɔndæm] *adj lat.* sabiq, keçmiş
**Quonset** ['kwɔnsıt] *n amer.* riflənmiş metaldan hazırlanmış yığma ev *(həm ~* **hut**)
**quorum** ['kwɔ:rəm] *n lat.* kvorum, yetərsay, əksəriyyət; *The quorum is reached, We have a quorum Kvorum/ Yetərsay var*
**quota** ['kwoutə] *n* **1**. norma, hədd, hissə, kvota; **inspection ~** *siya.* nəzarət kvotası *(tərksilah üzrə nəzarət sistemində)*; **2**. səsvermə zamanı tələb olunan minimum say; **3**. kvota *(istehsal, satış və s. üçün müəyyən hissə, faiz, norma və s.)*; **export /import ~** ixrac/idxal kvotası; **to take up a ~** kvotadan istifadə etmək; *The village was unable to raise its quota of men for the army Kənd orduya onun üçün ayrılmış sayda adam göndərə bilmədi*; **4**. *amer.* ölkəyə gəlmək üçün icazə verilmiş mühacirlərin miqdarı / sayı; *The quota of immigrants for this year has already been filled Bu il üçün nəzərdə tutulmuş mühacirlərin norması / kvotası artıq yerinə yetirilib*
**quotable** ['kwoutbl] *adj* sitat üçün yararlı, sitat gətirməyə lazım olan
**quotation** [kwou'teıʃn] *n* I **1**. sitat, iqtibas; **a ~ from Shakespeare** Şekspirdən sitat; **2**. sitat gətirmə; sitat gətirilmə
**quotation** [kwou'teıʃn] *n* II **1**. qiymət, dəyər; *Can you give me a quotation for building a garage? Sən / Siz mənə qaraj tikməyin neçəyə başa gəldiyini deyə bilərsənmi?/ bilərsinizmi?*; **2**. cari kurs, qiymət; **~ of the day** hərracdakı bugünkü /cari kurs / qiymət
**quotation-marks** [kwou'teıʃn'ma:ks] *n pl* dırnaq, dırnaq işarəsi (" ")

**quote** [kwout] *v* I 1. sitat gətirmək, kiminsə sözlərini iqtibas etmək; **to ~ from a book** kitabdan sitat gətirmək; **to ~ a verse from the Bible** Bibliyadan surəni vird etmək; 2. istinad/isnad etmək; **to ~ an example** misal gətirmək *(haradansa, müəllifdən və s.); Can you quote me a recent example? Sən/Siz yeni bir misal gətirə bilərsənmi?/ bilərsinizmi?*; 3. dırnaq açmaq, dırnağa almaq

**quote** [kwout] *v* II 1. qiymət qoymaq/təyin etmək, qiymətləndirmək; **to ~ a price on a house** evə qiymət qoymaq, evin qiymətini təyin etmək; *This is the best price I can quote you Bu mənim sənə / sizə deyə biləcəyim ən yaxşı qiymətdir*; 2. birja / hərrac qiymətini təyin etmək; *The shares are quoted on the Stock Exchange at 80 p. Hərracda/Birjada səhmlərin qiyməti 80 pennidir*

**quotidian** [kwɔ'tɪdɪən] *adj* 1. *tib.* hər gün baş verən, gündəlik, hər gün; **a ~ fever** tutması hər gün təkrar olunan malyariya; 2. adi, mənasız, yeknəsəq, çeynənmiş; **~ thought** adi/çeynənmiş fikir/mülahizə

**quotient** ['kwouʃnt] *n* 1. *riyaz.* qismət; nisbət; bölüm; 2. hissə, qisim; **electoral ~** namizədin seçilməsi üçün lazım olan səslərin sayı

**quotum** ['kwoutəm] *n* = **quota**



# Rr

**R r** [a:] *n (pl* **R's, r's** [a:z]*) ingilis əlifbasının 18-ci hərfi;*

◊ **the "r" months** tərkibində "r" hərfi olan aylar *(sentyabrdan aprelə qədər)*; **the three R's** *(reading, writing, arithmetic); The three R's – reading, writing and arithmetic are regarded as the basis of an education Üç "r" – oxu, yazı və hesab təhsilin/ savadın əsası hesab edilir*

**rabbit¹** ['ræbɪt] *n zool.* 1. krolik, evdovşanı; 2. krolik xəzi; 3. *d.d. məc.* qorxaq, ağciyər *(adam)*

**rabbit²** ['ræbɪt] *v* (-tt-) 1. krolik/dovşan ovlamaq; 2. krolik/dovşan tutmaq üçün tələ qurmaq; **to go ~ting** krolik/dovşan ovuna getmək; **to ~ on about *smb./smth.*** bir kəs /şey haqqında naqqallıq etmək/boş-boş danışmaq/çərənləmək; *What are you rabbitting on about? Sən/ Siz nə barədə naqqallıq edirsən/edirsiniz?* 3. **(together)** bir-birinə qısılmaq/sıxılmaq

**rabbit-breeder** ['ræbɪt͵bri:dəʳ] *n* krolikçi, krolik saxlayan

**rabbit-burrow** ['ræbɪt͵bʌrou] *n* krolik/dovşan yuvası

**rabbiter** ['ræbɪtəʳ] *n* 1. krolik/dovşan ovçusu; 2. krolik/dovşan ovlamaq üçün it

**rabbit-hearted** ['ræbɪt'ha:tɪd] *adj* qorxaq, qorxacaq, ağciyər, ürəksiz, cəsarətsiz, dovşan kimi qorxaq

**rabbit-hole** ['ræbɪthoul] *n* = **rabbit-burrow**

**rabbity** ['ræbɪtɪ] *adj* 1. krolik/dovşan çox/ bol olan *(yer haq.)*; 2. dovşanabənzər, dovşanaoxşar

**rabble** ['ræbl] *n* 1. yığın, dəstə; **a ~ of children** bir yığın/dəstə uşaq; 2. topa; **a ~ of books of all ages** bir topa köhnə və təzə kitab; 3. çox, hədsiz; **a ~ of doubts** çox/hədsiz şübhələr; 4.: **the ~s** aşağı silkdən olan adamlar, qara camaat, xalq kütləsi; **speeches appealing to the ~** qara camaata/xalq kütləsinə müraciətən edilmiş nitqlər

**rabid** ['ræbɪd] *adj* 1. quduz, qudurmuş, quduzlaşmış; **a ~ dog** quduz/quduzlaşmış it; 2. dəli, ağılsız, qudurğan, azğın, qızğın; **~ hate** azğın/qızğın nifrət; **~ love** qızğın məhəbbət; **~ reactionaries** qızğın irticaçılar

**rabidity** [rə'bɪdɪtɪ] *n* 1. quduzluq; 2. qəzəb, acıq, qeyz, azğınlıq, qudurğanlıq

**raccoon** [rə'ku:n] *n zool.* = **racoon**

**race¹** [reɪs] *n* I 1. yarış *(qaçmaq, at/maşın sürmək və s. üzrə)*; **to win/to lose a ~** yarışı udmaq /uduzmaq *(qaçış və s. üzrə)*; **to run a ~ with *smb.*** bir kəslə qaçış üzrə yarışmaq, bir kəslə ötüşmək; **a boat ~** qayıq sürmə yarışı; **to come first/second/ last in a ~** yarışda birinci/ikinci/sonuncu gəlmək *(finişə)*; 2. can atma, dalınca qaçma, tələsmə; **arms/armaments ~** qızğın silahlanma; **a ~ for power** hakimiyyətə can atma; **a ~ for wealth** var-dövlət dalınca qaçma, var-dövlətə can atma

**race** [reɪs] *n* II 1. irq; **the Mongolian ~** monqol irqi; **the black/white ~s** qara/ağ irqlər; **people of mixed ~** qarışıq irqdən olan adamlar; **without distinction as to ~** irqə fərq qoymadan, irqi ayrı-seçkilik salmadan/etmədən; 2. nəsil; tayfa; xalq; **the Spanish/Germanic ~s** ispan/alman tayfaları; **the human ~** insan nəsli, bəşəriyyət; **people of ancient and noble ~** qədim və zadəgan nəslindən olan adamlar; 3. cins; **to breed a ~ of cattle** cins mal-qara yetişdirmək

**race²** [reɪs] *adj* yarış; yarışda iştirak edən; **a ~ boat** yarış qayığı; **a ~ crew** yarışda iştirak edən komanda *(avarçəkmədə)*; **~ dog/ car** yarışda iştirak edən it/maşın

**race²** [reɪs] *v* 1. **(with, against)** yarışda iştirak etmək *(qaçış və s. üzrə); The drivers were racing against each other Sürücülər bir-birilə yarışırdılar;* 2. cıdırda iştirak etmək *(at və onun sahibi haq.)*; 3. sürətlə/çaparaq getmək, yüyürmək; qaçmaq, çapmaq; **to ~ down the street** küçə ilə qaçmaq/yüyürmək; *He raced along the road O, yol boyu qaçdı; Thick clouds were racing across the sky Qalın buludlar səmada sürətlə gedirdi*; 4. qovmaq, çaparaq sürmək *(atı)*, yüksək sürətlə sürmək *(maşını)*; **to ~ about** qaçmaq, gəzmək *(şəhəri)*, fırlanmaq *(evdə)*; **to ~ along** bərk/var gücü ilə qaçmaq; **to ~ away** cıdırda uduzmaq;

◊ **to ~ a bill through the House** qanun layihəsini təcili surətdə parlamentdən keçirmək

**race-card** ['reɪska:d] *n* cıdırların proqramı

**race-course** ['reɪskɔ:s] *n id.* cıdır meydanı

**race-day** ['reɪsdeɪ] *n* cıdır günü

**racehorse** ['reɪshɔ:s] *n* cıdır atı, qaçağan at

**racer** ['reɪsəʳ] *n* I 1. yürüşçü, yarışçı; 2. cıdır atı, qaçağan/bərk qaçan at; 3. yarış qayığı; 4. itigedən/sürətli gəmi; 5. yarış avtomobili

**racer** ['reɪsəʳ] *n* II *zool.* bağailanı

**racegoer** ['reɪsgouəʳ] *n* cıdır həvəskarı, ardıcıl olaraq cıdıra gedən

**race-track** ['reɪstræk] *n* 1. cıdır treki, cıdır üçün dairəvi yol; 2. yarış treki *(qaçanlar və s. üçün)*

**racial** ['reɪʃl] *adj* irqi; irqi cəhətdən, irqə görə, milli; **~ minorities** irqi/milli azlıqlar; **~ purity** irqi saflıq/təmizlik; **~ discrimination** irqi ayrı-seçkilik; **the fight for ~ equality** irqi bərabərlik uğrunda mübarizə

**racialism** ['reɪʃəlɪzm] *n* irqçilik

**racialist** ['reɪʃəlɪst] *n* irqçi, irqçilik tərəfdarı; *He's a racialist O, irqçidir*

**racing** ['reɪsɪŋ] *adj* yarış; **a ~ car/bicycle** yarış avtomobili/velosipedi

**rack**[1] [ræk] *n* I 1. paltarasan *(ucu qarmaqlı)*; 2. stellaj *(bir şeyi dik halda saxlamaq üçün qurğu)*; *She washed the dishes and put them in the rack to dry O, qabları yudu və qurumaq üçün stellaja qoydu*; 3. şey qoymaq üçün tor *(vaqonlarda, avtobuslarda və s.)*; *Put this box on the rack, please Zəhmət olmasa, bu qutunu torun üstünə qoy/qoyun*; 4. dirək; stend, dayaq; karkas *(bir şeyin gövdəsi)*; çərçivə; barmaqlıq, hasar

**rack** [ræk] *n* II dağılma, məhv olma; **to go to ~ and ruin** uçub dağılmaq/məhv olmaq; bərbad olmaq; *They let the house go to rack and ruin Onlar fikir vermədilər və ev uçub dağıldı; This country is going to rack and ruin; we need a change of government Bu ölkə məhv olur/dağılıb gedir; bizə hökuməti dəyişdirmək lazımdır*

**rack** [ræk] *n* III yorğa, yorğa yeriş

**rack** [ræk] *n* IV 1. *tar.* işgəncə aləti; 2. *məc.* əzab, əziyyət; əzab/əziyyət vermə; **to be on the ~** cəhənnəm əzabı çəkmək; **to put *smb.* on the ~** bir kəsə əzab-əziyyət vermək

**rack**[2] [ræk] *v* I 1. rəfə/taxçaya/ləməyə qoymaq; 2. qəfəsə/stellaja qoymaq; 3. axura/ yem qutusuna ot qoymaq *(həm də* **to ~ up**); 4. atı bağlamaq *(axura)*

**rack** [ræk] *v* II yorğa getmək/yerimək

**rack** [ræk] *v* III 1. əzab/əziyyət/işgəncə vermək, incitmək; **to be ~ed with/by jealousy** qısqanclıqdan əzab çəkmək; 2. gərmək, güc vermək, bütün gücünü qoymaq; **to ~ *one's* brains/*one's* wits** başını sındırmaq/çatlatmaq; **to ~ *one's* memory** yaddaşını gərmək, bir şeyi yada salmağa çalışmaq

**rack** [ræk] *v* IV sürətlə getmək *(bulud haq.)*

**racket**[1] *(həm də* **raquet)** ['rækɪt] *n* I *id.* raket *(tennis topunu vurmaq üçün torlu kürəcik)*

**racket** ['rækɪt] *n* II 1. səs, səs-küy, qalmaqal, hay-küy, mərəkə; gurultu; **to make a ~ 1)** səs-küy/hay-küy/qalmaqal qaldırmaq; bağırışmaq, çığır-bağır salmaq *(sərxoş dəstə və s. haq.)*; *Stop making that racket! Bu səs-küyü/hay-küyü dayandırın!/ dayandırın!* 2) guruldamaq, gurultu salmaq; guppuldatmaq; **to kick up a ~** səs-küy /çığır-bağır/qalmaqal qaldırmaq; 2. azğınlıq, qudurğanlıq, hərki-hərkilik; eyş-işrət, əyyaşlıq, sərxoşluq; **to go/to be on the ~** eyş-işrətlə məşğul olmaq, sərxoş həyat sürmək;

◊ **to stand the ~ 1)** hesablaşmaq, hesab çəkmək; qisas/intiqam almaq; 2) cavab vermək *(bir şeyə)*; 3) sınağa tab gətirmək /dözmək; *I'm getting too old to stand the racket Mən çox qocalmışam; bu sınağa tab gətirə bilmərəm*

**racket** ['rækɪt] *n* III 1. *amer.* yalan, fırıldaq, dələduzluq, kələk; 2. şantaj; zorakılıq, zorla/hədələməklə alma, reket

**racket**[2] ['rækɪt] *v d.d.* 1. səs/səs-küy/gurultu salmaq; gurultu qoparmaq; 2. səs-küylü həyat sürmək, eyş-işrətlə məşğul olmaq; 3. səs-küy /qalmaqal salmaqla mane olmaq *(bir kəsə)*; pozmaq *(sakitliyi)*

**racketeer** [.rækɪ'tɪəʳ] *n amer.* 1. reketir, şantajçı, hədə ilə/zorla/fırıldaqla başqasından pul qoparan adam; 2. fırıldaqçı, dələduz

**racketeering** [.rækɪ'tɪərɪŋ] *n amer.* fırıldaqçılıq, dələduzluq, şantaj

**raconteur** [.rækən'tɜ:ʳ] *n* yaxşı nağıl/ hekayə danışan

**racoon** [rə'ku:n] *n* 1. *zool.* yenot *(tünd-sarı rəngli qiymətli dərisi olan heyvan)*; 2. yenot xəzi

**racy** ['reɪsɪ] *adj (-ier, -iest)* 1. kəskin, güclü *(iy və s. haq.)*; 2. cins *(heyvan haq.)*; 3. canlı, parlaq *(üslub haq.)*; **a ~ description of New York life** Nyu Yorkun şəhər həyatının canlı təsviri

**radar**[1] ['reɪda:ʳ] *n* 1. radiolokator; 2. radiolokasiya

**radar**[2] ['reɪda:ʳ] *adj* radiolokator, radiolokasiya; **~ station** radiolokator/radiolokasiya stansiyası; **~ transmitter** radiolokator/radiolokasiya ötürücüsü; **~ operator** radiolokator qurğusunun operatoru/işçisi; **enemy ~** düşmən radiolokatoru; *The plane disappeared off the radar screen Təyyarə radiolokatorun ekranından yox/ qeyb oldu*

**raddled** ['rædld] *adj amer.* 1. sökülüb tökülən, köhnəlmiş, yırtılmış *(çox işlənməkdən)*; **~ radios** köhnəlmiş/sökülüb tökülmüş radiolar; 2. yorğun, üzgün; **a ~ face** yorğun/üzgün sifət

**radial** ['reɪdjəl] *adj* 1. radial *(radius istiqamətində olan)*; **~ spokes** radial dəndələr *(velosipedin təkərlərində)*; 2. şüa; **~ velocity** *fiz.* şüa sürəti; 3. *tib.* şüa; **~ disease** şüa xəstəliyi

**radiance** ['reɪdɪəns] *n* 1. şəfəq, işıq, parıltı, nur, şölə, şəfəqlənmə; **the sun's ~** günəşin şəfəqi/şöləsi/işığı; 2. gözəllik, dəbdəbə, cah-calal, təmtəraq, əzəmət; **~ of beauty** gözəlliyin əzəməti/dəbdəbəsi; 3. şüalılıq, parlaqlıq, parlama, işıq saçma

**radiancy** ['reɪdɪənsɪ] *n* = **radiance**

**radiant** ['reɪdjənt] *adj* 1. parlaq, şəfəqli, işıqlı, nurlu, nursaçan, gözqamaşdırıcı, şəfəqsaçan; **~ morning** parlaq səhər; **~ gems** parlaq/şəfəqsaçan daş-qaş; **~ beauty** gözqamaşdırıcı gözəllik; **~ intelligence** parlaq ağıl/zəka; **~ smile** nurlu təbəssüm; *She was radiant with joy O, sevincdən parlayırdı*; 2. şüalanma nəticəsində əmələ gələn; **~ heating** şüalanma istiliyi; **~ energy** şüadan əmələ gələn enerji

**radiate** ['reɪdɪeɪt] *v* 1. şüalandırmaq, şüa vermək/buraxmaq; **the heat that ~s from the sun** günəş şüalarının verdiyi istilik; **a stove that ~s warmth** istilik verən peç/ soba; 2. parlamaq, şəfəq/işıq saçmaq; üzü gülmək, sevinmək; *Her eyes radiated love and joy Onun gözləri məhəbbətdən və sevincdən parlayırdı. Onun gözlərindən məhəbbət və sevinc yağırdı; Happiness radiates from her eyes Onun gözlərindən xoşbəxtlik yağır; She radiates happiness where she goes O hara getsə, ora xoşbəxtlik aparır/gətirir*



**radiation**[1] [.reɪdɪ'eɪʃn] *n* 1. *fiz.* şüalanma, radiasiya; **atomic ~** atom şüalanması/radiasiyası; **a low/high level of ~** radiasiyanın/şüalanmanın aşağı/yüksək səviyyəsi; 2. şüalandırma, işığa salma; **to administer ~** işığa salmaq; 3. parlama; **~ of happiness** xoşbəxtlikdən şəfəq saçma/parlama

**radiation**[2] [.reɪdɪ'eɪʃn] *adj* radiasiya, şüalanma; **~ barrier** radiasiyadan/şüalanmadan müdafiə; **~ resistance** radioaktiv şüalanmaya davamlı; **~ damage** radioaktiv şüalanmadan alınan xətər /ziyan; **~ dose/dosage** radioaktiv şüalanmanın dozası; **~ sickness** şüa xəstəliyi; **~ chemistry** radioaktiv maddələrin kimyası; **~ therapy** radioaktiv şüalarla müalicə *(xərçəng və digər xəstəliklər haq.)*; **a ~ leak from a nuclear power station** atom elektrik stansiyasından radiasiyanın axması

**radiator** [.reɪdɪ'eɪtəʳ] *n* radiator; **to install a central heating system with a ~ in each room** hər bir otağa radiator qoymaqla mərkəzi istilik sistemi çəkmək; *We have a radiator in each of our room Bizim otaqlarımızın hər birində radiator var*

**radical**[1] ['rædɪkl] *n* 1. bünövrə, başlanğıc mənbə; əsas prinsip; 2. *dilç.* kök *(sözün)*; 3. *riyaz.* kök; 4. radikal fikirli adam

**radical**[2] ['rædɪkl] *adj* 1. əsaslı, əsas; **a ~ principle** əsas prinsip; **a ~ error** əsas səhv; **to make ~ changes** əsaslı dəyişikliklər etmək; **a ~ reform** əsaslı reforma/islahat; 2. radikal; qəti, köküdən; **a ~ politician** radikal siyasətçi; 3. yeni və fərqli; **a ~ politician ideas** radikal siyasi fikirlər; 4. *qram.* kök; **a ~ vowel** kök saiti; **~ languages** kök dillər *(yəni şəkilçisi olmayan, məs. Çin dili)*; 5. *riyaz.* kök, kökə aid olan; **a ~ sign** kök işarəsi

**radicalism** ['rædɪkəlɪzm] *n siya.* 1. radikalizm *(radikalların siyasi hərəkatı)*; 2. radikallıq

**radicality** [.rædɪ'kælɪtɪ] *n* radikallıq, qətilik

**radically** ['rædɪkəlɪ] *adv* 1. başlı-bütünlü; *English is radically a Germanic language İngilis dili başlı-bütünlü german dillərinə aiddir*; 2. tamamilə, tamam-kamal, büsbütün; **~ mistaken** tamamtlə səhv etmiş; 3. qəti surətdə; **to have ~ different views** tamamilə/büsbütün fərqli fikirlərə malik olmaq

**radii** ['reɪdɪaɪ] *n* **radius** *isminin cəm forması*

**radio**[1] ['reɪdɪou] *n (pl -os [-ouz])* 1. radio; **to turn the ~ on/off** radionu yandırmaq/ söndürmək; **to send a message by ~** radio vasitəsilə məlumat göndərmək; **to hear *smth.* on the ~** bir şeyi radiodan eşitmək; *I heard this information on the radio Mən bu məlumatı radiodan eşitdim*; 2. radioqəbuledici aparat; **a car ~** avtomobil radioqəbuledici; **a portable ~** portativ radioqəbuledici, əl radiosu; 3. radioqram; **to receive a ~** radioqram almaq; **to listen to ~** radioya qulaq asmaq

**radio**[2] ['reɪdɪou] *adj* radio; **a ~ programme /announcer/station** radio proqramı/ diktoru/ stansiyası; **a ~ play** radio pyesi; **a ~ channel** radio kanalı; **~ repair** radio təmiri; **~ waves/signals** radio dalğalar/ siqnallar

**radio**[3] ['reɪdɪou] *v* radio ilə xəbər vermək; radioqram göndərmək

**radio-** ['reɪdɪou-] *Termin xarakterli sözlərin tərkibində işlədilir:* **radio**man radist; **radio**telegraph radioteleqraf; **radio**active radioaktiv; **radio**gram radioqram

**radioactive** [.reɪdɪou'æktɪv] *adj fiz.* radioaktiv; radioaktivliyi olan; **highly ~** yüksək radioaktivliyi olan; **~ tracer** *fiz.* nişanlı atom; **~ area** radioaktiv maddələrlə zəhərlənmiş zona/rayon; **~ fallout** radioaktiv çöküntülər

**radioactivity** [.reɪdɪou'æktɪvɪtɪ] *n* radioaktivlik; **a rise in the level of ~** radioaktivliyin səviyyəsinin yüksəlməsi/ çoxalması

**radiochemistry** [reɪdɪou'kemɪstrɪ] *n* radiokimya

**radiographer** [.reɪdɪ'ɔgrəfəʳ] *n tib.* rentgenoloq

**radiography** [.reɪdɪ'ɔgrəfɪ] *n* radioqrafiya *(rentgen şüaları vasitəsilə şəkil alma)*

**radiologist** [.reɪdɪ'ɔlədʒɪst] *n* = **radiographer**

**radiology** [.reɪdɪ'ɔlədʒɪ] *n* radiologiya *(radium və başqa radioaktiv maddələrin tətbiq və təsirindən bəhs edən elm)*

**radiotherapy** [.reɪdɪou'θerəpɪ] *n tib.* rentgenoterapiya *(rentgen şüaları ilə müalicə)*

**radish** ['rædɪʃ] *n bot.* qırmızı turp; **a bunch of ~es** bir dəstə qırmızı turp

**radium** ['reɪdɪəm] *n kim.* radium

**radius** ['reɪdjəs] *n (pl -dii [-dɪaɪ])* 1. *riyaz.* radius *(dairənin mərkəz nöqtəsini hər hansı bir nöqtəsi ilə birləşdirən düz xətt)*; 2. sahə, rayon; əhatə dairəsi, hüdud; 3. *anat.* mil sümüyü

**radon** ['reɪdən] *n kim.* radon *(radioaktiv kimyəvi element)*

**raff** [ræf] *n top.i* tör-töküntü, zir-zibil *(pozğun, cinayətkar, cəmiyyətə zidd adamlar)*

**raffia** ['ræfɪə] *n bot.* 1. rafiya *(isti ölkələrdə bitən palma ağacının bir növü)*; 2. rafiya yarpaqlarından hazırlanmış lif

**raffish** ['ræfɪʃ] *adj* 1. pozğun, azğın, əxlaqsız, yolunu azmış; yava; **a ~ young man** pozğun/əxlaqsız gənc; 2. vulqar, bayağı; şit, ədəbsiz

**raffle**[1] ['ræfl] *n* pul-şey lotereyası; **to win a box of chocolates in a ~** pul-şey lotereyasında bir qutu şokolad udmaq

**raffle**[2] ['ræfl] *v* 1. lotereya oyunu keçirmək; 2. lotereya oyununda iştirak etmək; 3. lotereya oyununda priz təklif etmək

**raft**[1] [ra:ft] *n* I 1. sal; 2. bərə; 3. ağac axıtma *(çayla)*; 4. hava ilə doldurulmuş rezin/plastik qayıq

**raft** [ra:ft] *n* II *amer. d.d.* çox, hədsiz, çoxlu; hədsiz-hesabsız, saysız-hesabsız; bir yığın; **a ~ of**

**rules** çoxlu/saysız-hesabsız qaydalar; **a ~ of money** çoxlu/ saysız-hesabsız pul
**raft²** [ra:ft] *v* **1.** sal/bərə düzəltmək; **2.** salla /bərə ilə keçirmək; **3.** ağacı çayla axıtmaq
**rafter¹** [ˈra:ftəʳ] *n* I *tik.* çatı, çatma
**rafter** [ˈra:ftəʳ] *n* II çayla ağac axıdan *(fəhlə)*; sal sürən
**rafter²** [ˈra:ftəʳ] *v tik.* çatma qoymaq/ vurmaq
**raftsman** [ˈra:ftsmən] *n (pl* **-men** [-mən]) = **rafter** II
**rag¹** [ræg] *n* **1.** əsgi, cındır; **2.** parça, qırıntı, kəsik tikə *(parça və s. haq.)*; **3.** tikə, bir tikə/parça/topa; **to tear *smth.* to ~s** bir şeyi tikə-tikə/parça-parça cırmaq; **worn to ~s** geyinilib əldən düşmüş; **flying ~s of cloud** uçan bulud topaları; **4.** paltar, libas; **to be dressed in ~s** nimdaş/köhnəlmiş paltar geymək; *I haven't a rag to wear Mənim geyməyə paltarım yoxdur*; **5.** damcı, bir qırıq; **not a ~ of evidence** bir damcı/heç bir sübutu olmama; *He has still a few rags of decency O, hələ vicdanını itirməyib*;
◊ **from ~s to riches** qəflətən var-dövlətə çatma, qəflətən zənginləşmə; **to reduce *smb.* to a ~** bir kəsi incitmək/ yorub əldən salmaq
**rag²** [ræg] *v (-gg-)* **1.** cırnatmaq, sataşmaq, sürtüşmək; acıqlandırmaq, hirsləndirmək, özündən çıxartmaq; **2.** danlamaq, töhmətləndirmək, məzəmmətləmək, dərsini vermək; **3.** qalmaqal salmaq, səs-küy/dava-dalaş qaldırmaq; **to ~ over** mübahisə etmək, deyişmək
**ragamuffin** [ˈrægəmʌfin] *n d.d.* **1.** səfil, baldırıaçıq, dilənçi; **2.** sahibsiz/baxımsız/ kimsəsiz uşaq
**rage¹** [reɪdʒ] *n* **1.** qəzəb, qeyz, acıq; azğınlıq, hirs, hiddət; **blind with ~** qəzəbdən/ hiddətdən özünü bilməmə; **to put *smb.* into a ~** bir kəsi qəzəbləndirmək/hirsləndirmək/hiddətləndirmək; **mad with ~** qeyzdən/qəzəbdən/hiddətdən dəli vəziyyətinə gəlmə/dəli olma; **to fly/to get into a ~** qəzəblənmək, hiddətlənmək; **to be in a ~** qəzəbli/acıqlı/hirsli olmaq; **to be in a ~ with *smb.*** bir kəsə qəzəbi tutmaq/hirslənmək; **2.** azğınlıq, qudurğanlıq *(külək, dalğa və s. haq.)*; **the ~ of the wind/waves** küləyin/dalğaların azğınlığı; **the ~ of passion** ehtirasın azğınlığı; **3.** (**for**) ehtiras, şövq, böyük həvəs/maraq; **to have a ~ for hunting/ for horses** ovçuluğa /ata böyük həvəsi olmaq; **a ~ for fame/for leisure** şöhrətə/ nəşəyə can atma; **4.** coşğunluq, qızğınlıq, dəliqanlılıq; döyüşkən ruh; **in the ~ of battle** döyüşün qızğın çağında/şiddətli vaxtında
**rage²** [reɪdʒ] *v* **1.** hirsli/qeyzli/acıqlı olmaq; acıqdan hirslənmək/özündən çıxmaq/cini təpəsinə vurmaq; qudurğanlıq/azğınlıq etmək; **to ~ at/against *smb./smth.*** bir kəsə/şeyə hirslənmək; **2.** vıyıldamaq, guruldamaq; coşmaq, azğınlaşmaq, tüğyan etmək *(tufan, epidemiya, müharibə, ehtiras və s. haq.)*; *Smallpox raged throughout the city Çiçək xəstəliyi şəhərdə tüğyan edirdi; Outside a storm raged Bayırda tufan azğınlaşdı/tüğyan etdi; The sea raged Dəniz coşurdu*; **to ~ out** sakitləşmək *(tufan haq.)*
**rageful** [ˈreɪdʒfl] *adj* **1.** acıqlı, qəzəbli, hirsli, qeyzli; qudurğan, azğın; **2.** şiddətli, çox bərk, coşan, şiddətlənən, tüğyan edən
**ragged** [ˈrægɪd] *adj* **1.** kələ-kötür, əyri-üyrü; dişənmiş, diş-diş edilmiş, diş-diş; **~ edge** kələ-kötür/diş-diş edilmiş qıraq; **~ cliffs/rocks** diş-diş sıldırım qayalar; **a ~ knife blade** dişənmiş/diş-diş tiyəli bıçaq; **2.** köhnə, nimdaş, yırtıq, geyilib əldən salınmış *(paltar haq.)*; **a ~ coat** nimdaş/köhnə palto; **a ~ shirt** nimdaş/köhnə köynək; **~ trousers** geyilib əldən salınmış/nimdaş şalvar; **3.** cındır paltar/ cır-cındır geyinmiş; **4.** daranmamış, pırtlaşıq saçlı, saçları qarışmış/pərişan; **5.** səliqəsiz, pinti, laqeyd; **6.** ağır, nöqsanlı, qüsurlu *(üslub haq.)*; **a ~ sentence** qüsurlu/ağır cümlə; **7.** kəskin, xoşagəlməz *(səs haq.)*
**raggy** [ˈrægɪ] *adj* = **ragged**
**raging** [ˈreɪdʒɪŋ] *adj* **1.** qəzəbli, acıqlı, qeyzli; qudurğan, azğın, qızğın; **to be in a ~ temper** qəzəbdən özünü bilməmək/ özündən çıxmaq; **2.** coşğun, təlatümlü; **~ sea** coşğun/təlatümlü dəniz; **3.** kəskin, dözülməz, şiddətli, əzablı, əzabverici; **~ headache** şiddətli/dözülməz /əzabverici başağrısı; **~ thirsty** dözülməz susuzluq; *He has a raging fever O, qızdırmadan yanır*
**raglan** [ˈræglən] *adj* reqlan *(çiyni ilə qolu bütöv bir parçadan tikilmiş)*; **a ~ coat/ jemper** reqlan palto/cemper
**ragman** [ˈrægmən] *n (pl* **-men** [-mən]) cındırçı, cındıryığan, cındır alan; köhnə şeylər alverçisi, köhnə-kürüşçü
**ragout** [ˈrægu:, ræˈgu:] *n aşp.* raqu *(xırda doğranmış ət və tərəvəzdən bişirilmiş xörək)*
**raid¹** [reɪd] *n* **1.** basqın, axın, qəfil hücum; **air ~** hava basqını, qəfil hava hücumu; **a ~ on a bank** banka basqın/qəfil hücum; **a ~ on a gaming house** qumarxanaya qəfil hücum; **to make/to launch a ~ on enemy bases** düşmən bazalarına basqın/qəfil hücum etmək; **2.** reyd *(ictimai təşkilatların tapşırığı ilə aparılan ani yoxlama/təftiş)*; **police ~** polis reydi/ yoxlaması
**raid²** [reɪd] *v* basqın/qəfil hücum etmək; **to ~ a bank** banka basqın etmək
**raider** [ˈreɪdəʳ] *n* basqınçı, basqında iştirak edən adam, çapqınçı; **bank ~s** banka basqın edənlər, bankyaranlar
**rail¹** [reɪl] *n* **1.** hasar, çəpər, barı; **a wood ~ in front of an altar** səcdəgahın/mehrabın qabağında taxta hasar; **2.** tutacaq; məhəccər, sürahi; *Keep your hand on the rail as you climb the steps Pilləkənləri çıxarkən əllərinlə/əllərinizlə məhəccərdən tut/tutun*; **3.** rels; **to go off the ~s** relsdən çıxmaq; *The accident was caused by some of the rails becoming bent in the heat Hadisəyə relslərdən bəzilərinin istidən əyilməsi səbəb olmuşdu*; **4.** *d.d.* dəmir yolu; **by ~** dəmir yolu ilə; **to send *smth.* by ~** bir şeyi dəmir yolu ilə göndərmək; **to travel by ~** dəmir yolu ilə/qatarla səyahət etmək; **5.** paltarasan *(taxtaya bərkidilmiş)*
**rail²** [reɪl] *adj* dəmiryol, dəmir yolu; **a ~ junction** dəmiryol qovşağı; **a ~ station** dəmir yolu vağzalı/stansiyası
**rail³** [reɪl] *v* I **1.** hasarla/məhəccərlə dövrələmək, ətrafına hasar çəkmək *(həm də* **to ~ in/off**); **2.** rels çəkmək; **3.** dəmir yolu ilə göndərmək/yola salmaq/daşımaq
**rail** [reɪl] *v* II **1.** söyüş söymək; söyüşmək; deyişmək; **2.** (**at, against**) söymək, danlamaq, abırlamaq, abrını almaq/ tökmək; *The man railed at him and accused him of being lazy Kişi tənbəl olduğu üçün onu danladı və tənbeh etdi*
**railroad¹** [ˈreɪlroud] *n* dəmir yolu
**railroad²** [ˈreɪlroud] *adj* dəmiryol, dəmir yolu; **a ~ station** dəmiryol vağzalı/ stansiyası; **~ rates** dəmiryol tarifləri
**railroad³** [ˈreɪlroud] *v* **1.** dəmir yolu ilə daşımaq/göndərmək *(yükü, malı və s.)*; **2.** dəmir yolu ilə/qatarla getmək; **3.** dəmir yolu çəkmək/tikmək; **4.** dəmir yolunda işləmək
**railroader** [ˈreɪlroudəʳ] *n amer.* **1.** dəmiryolçu, dəmiryol işçisi; **2.** dəmiryol sahibi
**railway¹** [ˈreɪlweɪ] *n* dəmir yolu, dəmiryol xətti; **elevated/overhead ~** yerüstü /asma dəmir yolu; **underground ~** yeraltı dəmir yolu, metro; **to send by ~** dəmir yolu ilə göndərmək; **to work on a ~** dəmir yolunda işləmək
**railway²** [ˈreɪlweɪ] *adj* dəmiryol, dəmir yolu; **a ~ accident** dəmiryol qəzası; **~ travel** qatarla/dəmir yolu ilə səyahət; **~ guide** dəmiryol bələdçisi/soraq kitabçası; **~ bridge/train/system** dəmiryol körpüsü /qatarı/sistemi; **a ~ station** dəmiryol stansiyası/vağzalı; **a ~ junction** dəmir yolu qovşağı; qovşaq stansiyası; **a ~ engine** lokomotiv; parovoz, teplovoz; **a ~ carriage** dəmiryol vaqonu;
◊ **~ novel** yüngül/qatarda oxuna biləcək roman
**railway³** [ˈreɪlweɪ] *v* **1.** dəmir yolu çəkmək; **2.** dəmir yolu ilə səyahət etmək, qatarla getmək
**railwayman** [ˈreɪlweɪmən] *(həm də* **railman** [ˈreɪlmən]) *n (pl* **-men** [-mən]) dəmiryolçu, dəmir yolunda işləyən adam
**rain¹** [reɪn] *n* yağış; **continuous/quiet/ steady ~** arası kəsilməyən/sakit/aramsız yağış; **a drizzling ~** xırda/narın yağış, çiskin; **a pouring/pelting/torrential ~** şiddətli/güclü yağış, leysan; *It looks like rain Görünür, yağış yağacaq*; **to stay out in the ~** yağışdan islanmamaq; **to get out of the ~** yağışdan gizlənmək; *We've had a lot of rain this month Bu ay çoxlu yağış yağıb; Rain is still falling Yağış hələ də yağır*
**rain²** [reɪn] *v* **1.** *Bir qayda olaraq* **it** *şəxssiz əvəzliyi ilə işlədilir;* **It** *əvəzliyi Azərbaycan türkcəsinə tərcümə edilmir; It rains, It's raining Yağış yağır; It rained very hard yesterday Dünən bərk yağış yağdı*; **2.** *(daha çox* **to ~ down**) yağdırmaq, tökülmək; **to ~ blows/praises upon *smb.*** bir kəsin üstünə zərbələr /təriflər yağdırmaq; **to ~ arrows** ox yağdırmaq; **to ~ down shells on the enemy** düşmən üzərinə mərmi yağdırmaq; *İnvitations/ Gifts are raining on us Dəvətnamələr/ Hədiyyələr üstümüzə yağır*;
◊ *It rains cats and dogs* ≅ *Yağış elə bil vedrədən tökülür, leysan yağır*
**rainbow** [ˈreɪnbou] *n* göy qurşağı, qövsi-qüzeh; *d.d.* qarı nənənin örkəni; **all the colours of a ~** göy qurşağının bütün rəngləri
**raincoat** [ˈreɪnkout] *n* yağışkeçirməyən plaş, yağmurluq
**raincrop** [ˈreɪnkrɔp] *n k.t.* dəmiyə bitki
**raindrop** [ˈreɪndrɔp] *n* yağış damcısı
**rainfall** [ˈreɪnfɔ:l] *n* **1.** atmosfer çöküntüsü; **2.** atmosfer çöküntüsünün miqdarı; **3.** yağış; **an excess ~** leysan
**rain-gauge** [ˈreɪngeɪdʒ] *n* yağışölçən *(cihaz)*
**rainglass** [ˈreɪngla:s] *n* barometr *(hava təzyiqini ölçən cihaz)*
**raininess** [ˈreɪnɪnɪs] *n* yağmurluq, çiskinlik
**rainless** [ˈreɪnlɪs] *adj* yağışsız; quraqlıq; **~ year** quraqlıq il
**rainproof** [ˈreɪnpru:f] *adj* su buraxmayan/ keçirməyən/sızdırmayan
**rainstorm** [ˈreɪnstɔ:m] *n* yağış tufanı
**rainwater** [ˈreɪn.wɔ:təʳ] *n* yağış suyu; **to wash *one's* hair in ~** saçını yağış suyu ilə yumaq
**rainy** [ˈreɪnɪ] *adj* yağışlı; **a ~ day/morning/ evening** yağışlı gün/səhər/axşam; **~ weather** yağışlı hava;
◊ **for/against a ~ day** ≅ qara gün üçün; **to save/to keep *smth.* for a ~ day** bir şeyi qara gün üçün saxlamaq
**raise¹** [reɪz] *n* **1.** qalxma, qaldırma; artma, artırılma; güclənmə, gücləndirilmə; **2.** *amer.* əlavə, artım *(əmək haqqına)*; **to ask for a ~** əmək haqqını artırmağı tələb/xahiş etmək; *He got a raise Onun əmək haqqını/məvacibini artırdılar*; **3.** yoxuş; dağa gedən yol, yasamal
**raise²** [reɪz] *v* **1.** qaldırmaq *(həm də* **to ~ up**); **to ~ a weight from the ground** ağırlığı yerdən qaldırmaq; **to ~ *one's* hand** əlini qaldırmaq; *He raised the gun and fired O, silahı qaldırdı və atəş açdı; She raised her eyes O, gözlərini qaldırdı*; **to ~ a sunken ship** batmış gəmini qaldırmaq; **to ~ the blind** jalüzi qaldırmaq; **to ~ anchor** lövbəri qaldırmaq; **2.** qalxmağa kömək etmək; **to ~ *smb.* from his knees** bir kəsi dizi üstə qalxmağa kömək etmək; **3.** doğurmaq, yaratmaq; **to ~ laughter /a smile/ astonishment/ controversy** gülüş/təbəssüm/heyrət/ziddiyyət doğurmaq; **to ~ suspicion** şübhə yaratmaq do-

ğurmaq; to ~ **difficulties** çətinlik doğurmaq/yaratmaq/törətmək; 4. yüksəltmək, artırmaq; to ~ **prices** qiyməti yüksəltmək/artırmaq; to ~ **wages** əmək haqqını/maaşı artırmaq; to ~ **temperature** temperaturu artırmaq/ yüksəltmək; to ~ **production to a maximum** məhsulu maksimuma yüksəltmək; 5. yetişdirmək, becərmək; böyütmək *(bitki və s.)*; to ~ **cattle** qaramal yetişdirmək; to ~ **corn/ vegetables** taxıl/ tərəvəz becərmək; 6. bəsləmək, böyütmək; to ~ **a family** ailə saxlamaq; *I was raised among the mountains of the north Mən şimal dağlarında boya-başa çatmışam/ böyümüşəm*; 7. yığmaq, toplamaq *(pul)*; to ~ **taxes/rent** vergi/ev kirayəsi toplamaq; 8. götürmək *(məhdudiyyəti və s.)*; to ~ **an embargo/a quarantine** embarqonu/karantini götürmək; 9. təşkil etmək, düzəltmək; to ~ **a unit** hissə yaratmaq *(orduda)*;

◊ **to ~ *one's* glass to *smb.*** bir kəsin şərəfinə badə qaldırmaq/sağlığına içmək; **to ~ *one's* hand to *smb.*** bir kəsə əl qaldırmaq, bir kəsi vurmaq; **to ~ a dust** 1) həyəcanlanmaq, təlaş keçirmək, səs-küy qaldırmaq; 2) gözdən pərdə asmaq, aldatmaq

**raised** [reɪzd] *adj* 1. acımış *(xəmir haq.)*; 2. qabarıq; **a ~ platform** qabarıq platforma

**rake¹** [reɪk] *n* 1. dırmıq, çəng; 2. *tex.* zindan; 3. odçəkən, atəşkeş *(ocaqda odu qarışdırmaq üçün alət)*

**rake²** [reɪk] *v* 1. dırmıqlamaq, dırmıqlayıb yığmaq; **to ~ leaves into a pile** yarpaqları dırmıqlayıb bir yerə yığmaq; 2. dırmıqlayıb düzəltmək/hamarlamaq; **to ~ the soil smooth** dırmıqlayıb torpağı hamarlamaq; 3. *hərb.* uzaqdan atəşə tutmaq; *They raked the enemy with machine-gun fire Onlar düşməni uzaqdan pulemyot atəşinə tutdular*; 4. qarışdırmaq, çevirmək, eşələnmək, axtarmaq, diqqətlə axtarmaq; **to ~ through old magazines for facts** fakt tapmaq üçün köhnə jurnalların içində eşələnmək; *The police raked the district for the criminals Polis cinayətkarları tapmaq üçün bölgəni diqqətlə axtardı*; **to ~ off** dırmıqlayıb yığmaq/təmizləmək; **to ~ out** 1) kürüyüb götürmək/atmaq; 2) söndürmək; **to ~ out a fire** yanğını/ocağı söndürmək; 3) axtarmaq, axtarıb tapmaq, əldə etmək; **to ~ out information** məlumat əldə etmək; **to ~ together** dırmıqlayıb bir yerə yığmaq *(xəzəli və s.)*; **to ~ up** dırmıqla yığmaq; **to ~ up hay** quru otu dırmıqla yığmaq

**raking** [ˈreɪkɪŋ] *n* dırmıqla yumşaltma/ yığma

**rakish** [ˈreɪkɪʃ] *adj* əxlaqsız, pozğun; avara, veyl; **a ~ young man** pozğun/avara gənc *(oğlan)*; **to lead a ~ life** pozğun həyat sürmək

**rakishly** [ˈreɪkɪʃlɪ] *adv* əxlaqsız, pozğun; avara, veyl, əxlaqsız/pozğun bir tərzdə, avara-avara, veyl-veyl

**rakishness** [ˈreɪkɪʃnɪs] *n* əxlaqsızlıq, pozğunluq; avaralıq, veyllik

**rally¹** [ˈrælɪ] *n* I 1. birlik, birləşmə; 2. iclas, mitinq; qurultay; toplanış, yığıncaq; **a party ~** partiya iclası/qurultayı/toplanışı; **Nazi rallies** faşist yığıncaqları; 3. tez yaxşılaşma *(xəstəlikdən)*; *The patient made a rally today Xəstə bu gün yaxşılaşıb*; 4. *id.* avtomobil yarışı; zərbəyə zərbə ilə cavab vermə *(tennis oyununda)*; 5. canlanma *(tələbatda)*

**rally** [ˈrælɪ] *n* II zarafat, zarafat etmə, hənək

**rally²** [ˈrælɪ] *v (pt, pp* **rallied)** I 1. **(round)** yığışmaq, toplaşmaq, birləşmək; *The party rallied round him Partiya onun ətrafında birləşdi*; 2. yığmaq, toplamaq, birləşdirmək; *The leader rallied his men round him Lider adamlarını öz ətrafında birləşdirdi/topladı*; 3. özünə gəlmək, sağalmaq; **to ~ from an illness** xəstəlikdən sağalmaq; *He soon rallied from the shock of his father's death O, atasının ölümündən keçirdiyi şokdan tezliklə özünə gəldi*; 4. toplamaq, cəmləmək *(güc və s.)*; **to ~ *one's* wits** fikrini toplamaq/cəmləmək; 5. müdafiə etmək, tərəfini saxlamaq; **to ~ *smb.'s* opinion** bir kəsin fikrini müdafiə etmək, bir kəsin fikrinə şərik olmaq

**rally** [ˈrælɪ] *v* II zarafat/hənək etmək; zarafatlaşmaq; sataşmaq, ələ salmaq, araya qoymaq

**ram¹** [ræm] *n* 1. qoyun, erkək; 2. *tex.* korbud, döyəc *(şalban, dirək və s. bu kimi şeyləri yerə çalmaq üçün mexanikləşdirilmiş ağır çəkic)*; 3. çəkməçi zindanı; 4. döyəcləmə, toxaclama, döyəcləyib/ toxaclayıb bərkitmə

**ram²** [ræm] *v* **(-mm-)** 1. tarana getmək, çırpılmaq; *The car rammed into the bus Maşın avtobusa çırpıldı*; 2. döyəcləmək, toxaclamaq, döyəcləyib/toxaclayıb bərkitmək; 3. doldurmaq, tıxmaq, yeritmək; *He rammed his clothes into a bag O, paltarlarını bir çantaya doldurdu*; **to ~ *smth.* into *smb.*** bir şeyi bir kəsin beyninə yeritmək; **to ~ down** döyəcləyib bərkitmək; **to ~ *one's* hat down on *one's* head** papağını başına basmaq

**Ramadan** [ˌræməˈdæn, -ˈdɑ:n] *n din.* Ramazan *(Müsəlman ilinin 9-cu ayı)*, orucluq

**ramble¹** [ˈræmbl] *n* 1. gəzinti, məqsədsiz dolaşma/gəzmə; 2. rabitəsiz nitq; dolaşıqlıq; sayıqlama, sərsəmləmə

**ramble²** [ˈræmbl] *v* 1. gəzmək, dolanmaq, dolaşmaq; veyllənmək, avara-avara gəzmək; **to ~ through streets** küçələrdə veyllənmək/avara-avara gəzmək; 2. boş-boş danışmaq/çərənləmək; qırıq-qırıq danışmaq, sayıqlamaq; 3. fərq qoymadan /ağına-bozuna baxmadan oxumaq

**rambler** [ˈræmbləʳ] *n* 1. sərsəri, səfil, avara; 2. çox gül açan sarmaşan qızılgül

**rambling¹** [ˈræmblɪŋ] *n* gəzinti; **to go ~** gəzintiyə çıxmaq; **to go ~ on Sundays** bazar günləri gəzintiyə çıxmaq

**rambling²** [ˈræmblɪŋ] *adj* 1. gəzən, heç yerdə qərar tutmayan; avara, sərsəri, sərgərdan; 2. dağınıq, nizamsız *(tikinti haq.)*; **~ old houses** ni-



zamsız qədim /köhnə evlər; 3. rabitəsiz, qarışıq, əlaqəsiz *(nitq haq.)*; **a long ~ letter/speech** uzun rabitəsiz məktub/nitq; 4. sürünən, dırmaşan, sarmaşan *(bitki haq.)*; **~ roses** dırmaşan/ sarmaşan qızılgüllər

**ramification** [ˌræmɪfɪˈkeɪʃn] *n (adətən pl)* 1. şaxələnmə, qollara ayrılma; qol-budağa ayrılma, budaqlanma; **the ~ of a railway system** dəmir yol sisteminin şaxələnməsi/qollara ayrılması; 2. zoğ, qol, budaq, şaxə; **~s of a river** çayın qolları; **~s of a road** yolun qolları/şaxələri

**ramify** [ˈræmɪfaɪ] *v (pt, pp* **ramified)** 1. budaqlanmaq, qol-budaq atmaq; şaxələnmək, qollara ayrılmaq; *The road began to ramify Yol şaxələnməyə/qollara ayrılmağa başladı*; 2. zoğ vermək, qol-budaq atmaq; 3. *məc.* dərinləşmək; *Dissent has ramified İxtilaf/Ziddiyyət dərinləşib*

**ramp¹** [ræmp] *n* eniş; **to push a wheel-chair up/down a ~** təkərli stulu/əlil arabasını yuxarı/ aşağı itələmək

**ramp²** [ræmp] *v* 1. eniş aşağı getmək; 2. sürünmək, sarmaşmaq *(bitki haq.)*

**rampage¹** [ræmˈpeɪdʒ] *n* qəzəb, hiddət, qeyz, acıq; qudurğanlıq, azğınlıq, dəlilik; **to be/to go on the ~** qəzəblənmək, hiddətlənmək, qudurğanlıq etmək; *After the match, some football fans went on the rampage in the city centre Futbol oyunundan sonra bəzi fanatlar şəhərin mərkəzində qudurğanlıq etdilər*

**rampage²** [ræmˈpeɪdʒ] *v* qəzəblənmək, qeyzlənmək, hiddətlənmək, azğınlıq/ qudurğanlıq etmək; özündən çıxmaq

**rampancy** [ˈræmpənsɪ] *n* 1. qəzəb, hiddət, qeyz, acıq, qudurğanlıq, azğınlıq, özbaşınalıq, hərki-hərkilik; 2. təhlükəli xarakter/xüsusiyyət; **the ~ of crime** cinayətin təhlükəli xarakteri

**rampant** [ˈræmpənt] *adj* 1. azğın, tüğyan/ coşğunluq/azğınlıq edən; təhlükəli, qorxulu, təhdidedici, hədələyici; *Famine is rampant in the land Ölkədə aclıq tüğyan edir; Ignorance was rampant Nadanlıq hakim idi; Crime is rampant Cinayət təhlükəli/qorxulu vəziyyət alır*; 2. sıx, qalın *(bitki haq.)*; **a ~ tropic vegetation** sıx/qalın tropik bitki

**rampantly** [ˈræmpəntlɪ] *adv* coşğunluqla, azğınlıqla, qudurğancasına, coşğun/azğın bir tərzdə

**rampart** [ˈræmpɑ:t] *n hərb.* 1. *tar.* qala səddi; 2. dayaq məntəqəsi; qala, istehkam; 3. keçilməz /alınmaz/sarsılmaz müdafiə

**ramshackle** [ˈræm.ʃækl] *adj* 1. köhnə, qədim, qədimdən qalma; **a ~ house** köhnə/ qədim ev, xarabalıq; **a ~ vehicle** köhnə sınıq avtomobil/araba *(və s. minik vasitəsi)*; 2. *məc.* zəif, gücsüz; **a ~ empire** zəif/ gücsüz imperiya

**ran** [ræn] **to run** *felinin pt forması*

**ranch** [rɑ:ntʃ] *n amer.* ranço; iri fermer təsərrüfatı; böyük ferma *(xüs. heyvandarlıq)*, heyvandarlıq təsərrüfatı; **~ hands** heyvandarlıq təsərrüfatında işləyən fəhlə/işçi; **a sheep ~ in Australia** Avstraliyada qoyunçuluq ferması; **to run a cattle ~ in Texas** Texasda maldarlıq ferması saxlamaq

**rancher** [rɑ:ntʃəʳ] *n* 1. fermer, ranço/heyvandarlıq təsərrüfatının sahibi; rançoda /iri heyvandarlıq təsərrüfatında işləyən adam; 2. çoban, kovboy *(Şimali Amerikada atlı çoban)*

**rancid** [ˈrænsɪd] *adj* iylənmiş, qoxumuş, acılaşmış, qaxsımış *(xüs. yağ haq.)*; *The butter has gone/turned rancid Yağ qaxsıyıb/acıyıb; There was a rancid smell in the kitchen Mətbəxdən qaxsımış iy gəlirdi*

**rancor** [ˈræŋkəʳ] *n amer.* = **rancour**

**rancorous** [ˈræŋkərəs] *adj* hirsli, acıqlı, qəzəbli, kinli; qeyzlənmiş, qəzəblənmiş, hirslənmiş; **a ~ debate** hirsli/qəzəbli müzakirə

**rancour** [ˈræŋkəʳ] *n* hirs, qeyz, acıq, qəzəb, kin; *There was rancour in his voice Onun səsində qəzəb/kin vardı; There was rancour in the girl's eyes Qızın gözlərində kin/qəzəb vardı*

**random¹** [ˈrændəm] *n*: **at ~** fikirləşmədən, düşünmədən, bəxtəbəxt, hər nə cür gəldi; ağına-bozuna baxmadan; **to speak at ~** fikirləşmədən /düşünmədən danışmaq; **to shoot at ~** nişan almadan/bəxtəbəxt atmaq *(silahı)*; **to hit out at ~** hara gəldi vurmaq

**random²** [ˈrændəm] *adj* fikirləşmədən/düşünmədən görülən; təsadüfi, götür-qoy edilməmiş; nizamsız, ixtiyari; **a ~ choice** təsadüfi seçim; **~ reading** təsadüfi/ səliqəsiz oxu; **a ~ bullet** nagafil güllə

**range¹** [reɪndʒ] *n* 1. cərgə, sıra, səf *(bina və s. haq.)*; qatar, silsilə; **a ~ of mountains** dağ silsiləsi; **the ~ of events** hadisələrin silsiləsi; *The tree is in range with the house Ağac evlə bir sıradadır*; 2. ərazi, sahə, dairə; **the ~ of a science** elm sahəsi; **a vast ~ of knowledge** biliyin geniş sahəsi; *Latin is out of my range Latın dili mənim sahəm deyil*; **in the whole ~ of politics** siyasətin ən kəskin məsələsi; 3. məsafə, uzaqlıq; **at close ~** yaxında, yaxın məsafədə; **at long ~** uzaqda, uzaq məsafədə; **to find/to take a ~** məsafəni müəyyən etmək; 4. assortiment, çeşid; nomenklatura; **~ of commodities/of items** malların çeşidi; 5. *hərb.* poliqon *(hərbi təlim və təcrübə meydanı)*, atış meydanı; tir *(nişan atmaq üçün yer)*; 6. qədim dəbli soba; **a kitchen ~** mətbəx sobası/peçi; **a gas ~** qaz peçi

**range²** [reɪndʒ] *v* 1. düzmək, sıraya düzmək, qaydaya qoymaq; **to ~ soldiers** əsgərləri cərgəyə düzmək; **to ~ books on a shelf according to size** formatına görə kitabları rəfə düzmək/yerləşdirmək; 2. **(along)** uzanmaq, uzanıb getmək; **houses that ~ along the railway** dəmir yolu boyunca uzanıb gedən evlər; *The mountains range north and south Dağlar şimala və cənuba uzanır*; 3. **(with)** müvazi/paralel olaraq get-

mək; *The line of cliffs ranges very closely with the river Sıra qayalar çaya yaxın müvazi olaraq uzanıb gedir*; 4 (**with**) bir cərgədə durmaq *(bir şeylə)*; *Our house ranges with the next building Bizim evimiz qonşu bina ilə bir cərgədə durur*; 5. (**with, among**) eyni səviyyədə/bir cərgədə olmaq, bərabər olmaq; *He ranges with/among the great writers O, böyük yazıçılarla bir cərgədə/eyni səviyyədə durur*; 6. (**from, between**) tərəddüd etmək, dəyişmək, qərarsızlıq göstərmək; *Prices ranged between 2/6 and 10 Qiymətlər 2 şillinq 6 pens və 10 şillinq arasında dəyişirdi*; 7. (**over, through**) *şair.* veyllənmək, avara/avara-avara gəzmək, gəzib dolaşmaq; **to ~ forests/hills** meşələrdə /dağlarda gəzmək /gəzib dolaşmaq; **to ~ the whole world** bütün dünyanı gəzmək/gəzib dolaşmaq; 8. təsnif etmək, siniflərə ayırmaq; sistemə salmaq; **to ~ plants/animals according to genus and species** bitkiləri və heyvanları cinsinə və növünə görə təsnif etmək/siniflərə ayırmaq/bölmək; 9. aralanmaq, aralı gəzmək; *At this stage, the young animals do not range far from the family Bu mərhələdə cavan heyvanlar ailədən çox uzaqlaşmırlar/aralı gəzmirlər*

**rangefinder** [ˈreɪndʒ͵faɪndəʳ] *n* 1. məsafəölçən cihazla işləyən mütəxəssis; 2. *tex.* məsafəölçən *(aparat)*

**ranger** [ˈreɪndʒəʳ] *n* 1. səyyah, yolçu; sərsəri; sərgərdan, avara, yurdsuz, səfil *(adam)*; 2. meşə gözətçisi; atlı qoruqçu, meşəbəyi; 3. *amer.* atlı polis; 4. kral parkının gözətçisi, kral parkına baxan/qulluq edən *(İngiltərədə)*

**rangy** [ˈreɪndʒɪ] *adj* (**-ier, -iest**) 1. *amer.* geniş, ucsuz-bucaqsız *(düzənlik və s. haq.)*; 2. gəzən, bir yerdə qərar tutmayan; köçəri *(heyvan və balıq haq.)*; 3. uzunayaq, uzunayaqlı *(adət. heyvan haq.)*

**rank¹** [ræŋk] *n* 1. sıra, cərgə, səf; **a ~ of houses** evlərin sırası/cərgəsi; **to break the ~s** cərgəni pozmaq, cərgədən çıxmaq; **to close ~s** sıraları sıxlaşdırmaq; **to join the ~s** cərgəyə/sıraya durmaq; 2. (**the ~s**) *pl* ordu; hərbi xidmət; **to join the ~** hərbi xidmətə daxil olmaq; **to reduce to the ~s** rütbəsini alıb sıravi əsgər etmək; **to rise from the ~** sıravi əsgərdən zabit rütbəsinə yüksəlmək; 3. rütbə, ad; ləyaqət; vəzifə; **the ~ of admiral/of capitain** admiral/kapitan rütbəsi; 4. kateqoriya, sinif, təbəqə, dərəcə; **people of all ~s** cəmiyyətin bütün təbəqələrindən olan adamlar; **a poet/a painter/ a writer** *etc.* **of the highest ~** ən yüksək rütbəli şair/rəssam/yazıçı *və s.*; **artist of the second ~** adi/orta aktyor; *He is in the highest rank among scholars O, alimlər içərisində aparıcıdır*; 5. yüksək vəziyyət; **persons of ~** zadəganlar; **pride of ~** lovğalıq, təkəbbür, qürur, təşəxxüs, iddia; 6. taksi dayanacağı; **the taxi at the head of the ~** dayanacaqdakı birinci taksi;

◊ **~ and file** 1) sıravi heyət; sıravi əsgərlər; 2) sıravi nümayəndələr *(peşədə, sənətdə və s.)*; 3) sıravi üzvlər *(təşkilatda)*; 4) adi adamlar, camaat, kütlə; **to take ~ with** *smb. hərb.* bir kəslə eyni rütbədə olmaq

**rank²** [ræŋk] *adj* 1. coşğun, gur, sıx, qalın *(bitki haq.)*; *The roses are growing rank Qızılgüllər sıx yarpaqlayır*; 2. basmış, örtülmüş; **~ with weeds** alaq basmış/alaq ilə örtülmüş; 3. acılaşmış, qoxumuş, iylənmiş, qaxsımış, xarab olmuş; **~ butter** acımış /qaxsımış yağ; **~ fish** qoxumuş/iylənmiş balıq; **~ smell** üfunət; **to grow ~** acımaq, qaxsımaq, iylənmək, xarab olmaq; 4. çox pis, çirkin, iyrənc, mənfur; qəbih, rəzil, murdar, xəbis; **~ treason** mənfur satqınlıq; **~ traitor** rəzil/xəbis satqın; **~ lie** mənfur/çirkin yalan; 5. açıq, açıqdan-açığa, aşkar; **~ nonsense** açıq/aşkar cəfəngiyyat; **~ swindler** aşkar fırıldaqçı; 6. kobud, qaba, ədəbsiz; abırsız, həyasız, utanmaz, arsız

**rank³** [ræŋk] *v* 1. sıraya/cərgəyə düzmək; **to ~ books on a shelf** kitabları rəfdə sıraya düzmək; *The cups were ranked neatly on the shelf Fincanlar rəfdə səliqə ilə düzülmüşdü*; 2. təsnif etmək; qiymətləndirmək, qiymət vermək; **to ~ Dante above Shakespeare** Danteni Şekspirdən üstün tutmaq; **to ~ football above baseball** futbolu beysboldan üstün tutmaq; *I rank his abilities very high Mən onun qabiliyyətlərini yüksək qiymətləndirirəm*; *His name will be ranked with the great names of history Onun adı tarixin böyük şəxsiyyətləri sırasına daxil ediləcək*; 3. aid olmaq, hesab edilmək; **to ~ among the Great Powers** böyük dövlətlər sırasına aid olmaq; **to ~ among the first** birincilər sırasında olmaq; 4. yer tutmaq; **to ~ third** üçüncü yer tutmaq; **to ~ above/below** *smb.* bir kəsdən üstün/aşağı olmaq; 5. daha yüksək mövqe tutmaq; *A colonel ranks a major Polkovnik rütbəsi mayor rütbəsindən yüksəkdir*; **to ~** *smb.* **in age** yaşca bir kəsdən böyük olmaq

**ranking¹** [ˈræŋkɪŋ] *n* 1. yerləşmə, yerləşdirmə; qoyma, qoyulma; düzmə, düzülmə; düzülüş; 2. *id.* yüksək dərəcəli yer; **to achieve ~** 1) yarışda yüksək dərəcəli yer tutmaq; 2) idman dərəcəsi almaq

**ranking²** [ˈræŋkɪŋ] *adj* 1. yuxarıdakı, yuxarı, ali; rütbəcə/vəziyyətcə yuxarı olan; **~ member** yaşlı/böyük üzv *(rütbəcə və s.)*; **the ~ member of the embassy** səfarətxananın/səfirliyin başçısı; 2. *hərb.* rütbəcə yüksək; 3. yüksək vəzifə/mövqe tutan; **~ representatives** məsul nümayəndələr; 4. vacib; görkəmli, məşhur; **a ~ American historian** görkəmli amerikan tarixçilərindən biri; **a ~ pace in the economic structure** ölkənin iqtisadiyyatında vacib yer; 5. *id.* birinci dərəcəli

**rankle** [ˈræŋkl] *v* 1. parçalamaq, dağıtmaq; iztirab/əzab/əziyyət vermək *(ruhən)*, üzmək *(xatirə, küsü, inciklik və s.)*; **to ~ in the heart** ürəyi



parçalamaq/dağıtmaq; *It rankled the girl Bu, qıza əzab/əziyyət verdi*; 2. irinləmək, irin gəlmək/vermək, sağalmamaq *(yara haq.)*; *The wound still rankles Yara hələ irin verir, Yaradan hələ irin gəlir*

**ransack** [ˈrænsæk] *v* 1. (**for**) axtarmaq, araşdırmaq, hər tərəfi diqqətlə yoxlamaq/ axtarmaq, gəzmək *(bir şeyi tapmaq üçün)*; **to ~ a box/a cupboard for a lost article** itmiş şeyi tapmaq üçün qutunun/ qab şkafının altını üstünə çevirmək; *The police have ransacked the room to find the rifle Tüfəngi tapmaq üçün polis otağın altını üstünə çevirdi (yəni diqqətlə yoxladı)*; 2. soymaq, qarət/talan etmək, talamaq, çalıb-çapmaq; **to ~ a city** şəhəri talan/qarət etmək/çalıb-çapmaq; **to ~** *smb.'s* **pockets** bir kəsin cibini soymaq; *Enemy soldiers ransacked the town Düşmən əsgərləri şəhəri talan etdi/çapıb taladı*

**ransacker** [ˈrænsækəʳ] *n arx.* soyğunçu, qarətçi, talançı, çapqınçı, quldur, çapovulçu, yolkəsən

**ransom¹** [ˈrænsəm] *n* pul verib azad etmə/ qurtarma; girovu geri alma; **to hold** *smb.* **to ~** bir kəsə görə girov tələb etmək; *They took away the boy and held him to ransom Onlar oğlanı tutub apardılar (oğurladılar) və onu buraxmaq üçün pul tələb etdilər*

**ransom²** [ˈrænsəm] *v* pul verib azad etmək/qurtarmaq; girovu geri almaq; *His wife ransomed him at a heavy price Arvadı çoxlu pul verib onu azad etdi*

**ransomer** [ˈrænsəməʳ] *n* xilaskar *(İsa peyğəmbər haq.)*

**rant¹** [rænt] *n* təşəxxüslü/məğrur/təmtəraqlı /qəliz/ibarəli nitq; boşboğazlıq, gəvəzəlik, naqqallıq; demoqogiya, demoqoqluq

**rant²** [rænt] *v* təmtəraqla/ibarəli/boş-boş danışmaq, naqqallıq etmək, çərənləmək; *The priest ranted about the devil and all his works Keşiş şeytan və onun əməlləri haqqında təmtəraqla/boş-boş danışdı*

**rap¹** [ræp] *n* 1. yüngül zərbə; **to give** *smb.* **a ~ over/on the fingers** bir kəsin əlinin üstünə yüngülcə/ehmalca vurmaq; *The teacher gave me a rap over the head with her pencil Müəllim karandaşı ilə mənim başıma yüngülcə vurdu*; 2. asta tıqqıltı; **to hear a ~ on the door** qapıda asta tıqqıltı eşitmək; *There was a rap on the door Qapıda astaca tıqqıltı eşidildi*

**rap²** [ræp] *v* (**-pp-**) 1. yüngülcə vurmaq; **to ~** *smb.'s* **knuckles/***smb.'s* **fingers, to ~** *smb.* **over the knuckles/over the fingers** bir kəsin əlinin üstünə vurmaq; 2. taqqıldatmaq, döymək, tıqqıldatmaq; **to ~ at a door** qapını tıqqıldatmaq; *The chairman rapped on the table Sədr əli ilə stolu taqqıldatdı*; 3. ciddi danışmaq; qışqırmaq, bağırmaq, çığırmaq; 4. söyüşmək, deyişmək, küsüşmək

**rapacious** [rəˈpeɪʃəs] *adj* 1. tamahkar, acgöz, gözü-doymaz; xəsis, simic; **~ capitalists** tamahkar/acgöz kapitalistlər; 2. işğalçılıq, qəsbkarlıq, istilaçılıq; soyğunçu; **~ invaders** soyğunçu istilaçılar /qəsbkarlar; 3. yırtıcı, vəhşi *(heyvan haq.)*

**rapacity** [rəˈpæsɪtɪ] *n* tamahkarlıq, acgözlük, gözüdoymazlıq; hərislik, xəsislik, simiclik; qarınquluLuq

**rape¹** [reɪp] *n* I 1. zorlama, zorlanma; **to commit ~** zorlamaq *(qadını, qızı)*; *He was sent to prison for rape Zorlama üstündə onu həbs etdilər*; 2. korlanma, xarab olma; korlama, xarab etmə; **the ~ of our beautiful forests** bizim gözəl meşələrimizin korlanması

**rape** [reɪp] *n* II *bot.* raps *(yem kimi istifadə edilən, toxumundan yağ çıxarılan ot bitkisi)*; **a field of ~** raps tarlası

**rape²** [reɪp] *v* zorlamaq; **to ~ a girl/a woman** qızı/qadını zorlamaq; *She claimed (that) she had been raped O iddia qaldırdı ki, onu zorlayıblar*

**rapid** [ræpɪd] *adj* 1. tez, iti, yeyin, cəld, sürətli; **a ~ movement** sürətli/cəld hərəkət; **a ~ growth** tez/sürətli inkişaf; **~ gait** iti/tez yeriş, iti addım; **a ~ river/ stream** iti/coşğun çay/axın; **to take a ~ glance** cəld baxmaq, ani nəzər salmaq; **a ~ heart** *tib.* taxikardiya *(ürəyin tez-tez vurması)*; 2. dik, dimdik, sıldırım, yalçın *(eniş, yamac və s. haq.)*; **a ~ descent/ ascent** dik eniş/yoxuş; *There was a rapid rise in the highway Şose yolunda dik yoxuş vardı*

**rapidity** [rəˈpɪdɪtɪ] *n* tezlik, yeyinlik, itilik, sürətlilik, cəldlik

**rapidly** [ˈræpɪdlɪ] *adv* tez, cəld, sürətlə; **a ~ growing economy** tez/sürətlə inkişaf edən iqtisadiyyat; *The work is progressing rapidly İş sürətlə inkişaf edir*

**rapier** [reɪpjəʳ] *n* rapira *(məşq qılıncı)*

**rapine** [ˈræpaɪn] *n* 1. soyğun, soyğunçuluq, qarət, talan, quldurluq; 2. yırtıcılıq, vəhşilik; **beasts of ~** vəhşi/yırtıcı heyvanlar

**rapist** [ˈreɪpɪst] *n amer.* zorlayan/zorakılıq göstərən adam

**rapt** [ræpt] *adj* heyran, məftun; fərəhli; **a ~ look** heyran/məftun/fərəhli baxış; **to listen with ~ attention** məftunluqla qulaq asmaq

**rapture¹** [ˈræptʃəʳ] *n* şövq, fərəh, vəcd; vəcdə/cuşa gəlmə; məftunluq, heyranlıq, coşğunluq; **to be in/to go into ~s** vəcdə/cuşa gəlmək

**rapture²** [ˈræptʃəʳ] *v şair.* heyran/valeh/ məftun etmək, vəcdə gətirmək

**raptured** [ˈræptʃəd] *adj şair.* fərəhli, qızğın, coşğun; vəcdə/cuşa gəlmiş, həyəcanlanmış, coşmuş

**rapturous** [ˈræptʃərəs] *adj* coşğun, qızğın, fərəhli; **~ applause** coşğun/qızğın alqış; **a ~ girl** qızğın/fərəhli qız

**rare** [reəʳ] *adj* (**-r, -st**) I nadir, az tapılan, az təsadüf edilən, az rast gələnən; **a ~ book/ bird/butterfly** nadir kitab/quş/kəpənək; **a ~ occurrence** az təsadüf edilən hadisə; **~ courage** nadir cəsa-

rət; a ~ **scholar** nadir alim; **a ~ disease** az təsadüf edilən xəstəlik; *It is extremely rare for the weather in April to be this hot Havanın aprel ayında belə isti olması nadir haldır*

**rare** [reəʳ] *adj* II yaxşı qızardılmamış, çiy *(xüs. ət haq.)*

**rarefied** [ˈreərıfaıd] *adj* 1. zərifləşdirilmiş, naziklәşdirilmiş, incələşdirilmiş; 2. qaldırılmış, yüksəldilmiş; **promoted to ~ rank** yüksək vəzifəyə qaldırılmış, yuxarı rütbəyə yüksəldilmiş

**rarefy** [ˈreərıfaı] *v* nazikləşdirmək; incələşdirmək, zərifləşdirmək; nazik/ zərif etmək

**rarely** [ˈreəlı] *adv* 1. nadir, az-az, arabir, nadir hallarda; **an odd little man who ~ spoke** nadir hallarda danışan balaca qəribə kişi; *She is rarely seen in public nowadays Bu günlərdə o, ictimaiyyət içərisində az-az görünür; I see him very rarely Mən onu çox az-az görürəm*; 2. son dərəcə; çox yaxşı/qəşəng; **~ honest** son dərəcə namuslu/təmiz/səmimi; *We dined rarely Biz çox yaxşı nahar etdik*

**rareness** [ˈreənıs] *n* nadirlik, az təsadüf edilən /nadir şey; qeyri-adilik, müstəsnalıq

**rarity** [ˈreərıtı] *n* 1. nadirlik, müstəsna hadisə, müstəsnalıq; *Here a fine day is rarity Burada gözəl gün müstəsna hadisədir*; 2. antikvar, əntiq şeylər; **a museum full of rarities** əntiq şeylərlə dolu muzey

**rascal** [ˈra:skl] *n* 1. fırıldaqçı, dələduz, hiyləgər; 2. *zaraf.* bic, kələkbaz, cüvəllağı, haramzadə; *Give me my keys back, you little rascal! Mənim açarlarımı mənə qaytar, ay kələkbaz!*; 3. *top.i arx.* törtöküntü, zir-zibil *(cəmiyyətə zidd adamlar)*

**rash**[1] [ræʃ] *n* I *tib.* səpmə, səpki; **to come out/to break out in a ~** səpmək; *I break out/come out in a rash if I eat chocolate Mən şokolad yeyəndə səpirəm*; **a heat ~** istidən səpmə; *The heat brought her out in a red itchy rash İstidən onda qaşınan səpmə əmələ gəldi*

**rash** [ræʃ] *n* II xışıltı, xışıldama; **to hear ~** xışıltı eşitmək

**rash**[2] [ræʃ] *adj* çox tələsik, təcili, düşünülməmiş, ehtiyatsız, diqqətsiz; **a ~ judgement** tələsik /düşünülməmiş mühakimə; **~ statement** düşünülməmiş bəyanat; **~ measures** ehtiyatsız/ düşünülməmiş tədbirlər; **~ words** ehtiyatsız /düşünülməmiş sözlər; **a ~ promise** tələsik/ehtiyatsız verilmiş vəd; **a ~ act** ehtiyatsız /düşünülməmiş hərəkət

**rasher** [ˈræʃəʳ] *n* nazik kəsilmiş bekon *(duzlanmış, hisə verilmiş donuz əti)*; **a fried egg and two ~s of bacon for breakfast** səhər yeməyi üçün qızardılmış yumurta və iki nazik kəsilmiş bekon

**rashly** [ˈræʃlı] *adv* çox tez/tələsik, tez-tələsik; fikirləşmədən, düşünmədən; ehtiyatsızlıqla; lazımınca fikirləşmədən/düşünmədən; ehtiyatsız olaraq

**rasp**[1] [ra:sp] *n* 1. sürtkəc, pendirtəraş, turptəraş; 2. *k.t.* yonca toxumunu təmizləyən maşın; 3. *tex.* törpü, qovra; 4. qıcırtı; cırıldayan/xışıldayan kəskin səs; **the ~ of a saw on wood** odunkəsən mişarın səsi

**rasp**[2] [ra:sp] *v* 1. qaşımaq, qazımaq; yonmaq; 2. sürtmək *(sürtkəclə)*; 3. yonmaq, rəndələmək, yonub/rəndələyib təmizləmək *(adət.* **to ~ off/away**); 4. qıcırdatmaq, kəskin qıcırtılı səs çıxartmaq; 5. qulağı deşmək/dəlmək *(səs haq.)*; qıcıqlandırmaq, əsəbiləşdirmək; **to ~ the nerves** əsəblərə toxunmaq/təsir etmək; **wine that ~s the throat** boğazı qıcıqlandıran şərab /çaxır

**raspberry**[1] [ˈra:zbərı] *n bot.* 1. moruq; 2. moruq kolu *(həm də* **~ bush)**

**raspberry**[2] [ˈra:zbərı] *adj* moruq; **~ jam** moruq cemi/mürəbbəsi; **~ bush** moruq kolu; **~ field** moruqluq, moruq kolluğu

**rat**[1] [ræt] *n* 1. *zool.* siçovul; **to clear a place of ~s** bir yeri siçovullardan təmizləmək, bir yerdə olan siçovulları qırmaq/tələf etmək *(zəhərlə və s.)*; *Rats desert/leave/forsake a sinking ship Siçovullar batan gəmini tərk edir*; 2. qorxaq; satqın; xain, dönük, mürtəd; 3. çuğul, xəbərçi, xəbər daşıyan; 4. satqınlıq; çuğulçuluq;

◊ **to die like a ~ in a hole** *at. söz.* ≅ it kimi ölmək; **to be caught like a ~ in a trap** siçovul kimi tələyə düşmək

**rat**[2] [ræt] *v (-tt-)* 1. siçovulları qırmaq/ məhv etmək *(əsas. itlər vasitəsilə)*; 2. satmaq, çuğulluq etmək, donos vermək, şeytanlamaq; 3. **(on)** imtina etmək, boyun qaçırmaq; **to ~ on one's debts** borclarını verməkdən imtina etmək/boyun qaçırmaq

**rate**[1] [reıt] *n* 1. norma, say, ölçü, əndazə; **~ of profit/of return** *siya. iq.* gəlir norması; **~ of surplus value** *siya. iq.* izafi dəyərin norması; **~ of production** istehsal norması; **the ~ of speed per minute** hər dəqiqədə sürətin norması; **birth ~** doğum sayı/norması; 2. tarif; nırx; aylıq, maaş; **the ~s of wages per week** hər həftə üçün maaş tarifi; **an insurance ~** sığorta mükafatının tarifi/ miqdarı; **a ~ of duty** gömrük rüsumunun tarifi; 3. *mal.* məzənnə; **the ~ of exchange** valyuta məzənnəsi; **dollar ~** dolların məzənnəsi; 4. qiymət; **to buy/to sell at a high ~** yüksək qiymətə almaq/ satmaq; **at an easy ~** 1) ucuz qiymətə; 2) asan, zəhmətsiz, cəhdsiz; **to win success at an easy ~** asanlıqla müvəffəqiyyət qazanmaq; 5. sürət, temp; **the ~ of growth** inkişaf sürəti/tempi; **the ~ of climb** *av.* qalxmanın sürəti; **the ~ of descent** *av.* enmənin sürəti; 6. *id.* dərəcə, kateqoriya;

◊ **at any ~** hər halda, ən azı; *He has improved somewhat, in manners at any rate Hər halda o, davranışını bir qədər yaxşılaşdırıb*; **at that ~** bu halda, əgər bu belədirsə, əgər bu həqiqətə



uyğundursa; *At that rate we shan't get any dinner Belə getsə biz bu gün nahar edə bilməyəcəyik*

**rate**[2] [reıt] *v* I 1. qiymətləndirmək, qiymət qoymaq, qiymətini müəyyənləşdirmək; **to ~ smb./smth. high** bir kəsi/şeyi yüksək qiymətləndirmək; **to ~ a coin/paper money above /below its real value** sikkəyə/kağız pula həqiqi dəyərindən yuxarı/aşağı qiymət qoymaq; 2. hesab etmək; **to ~ one profession above another in usefulness** bir peşəni əhəmiyyətinə görə digərindən üstün hesab etmək; *He doesn't rate himself an ordinary teacher O özünü adi müəllim hesab etmir; I rate him among my friends Mən onu dostlarım arasında üstün hesab edirəm*; 3. *amer.* qiymət yazmaq *(şagirdə)*; biliyi qiymətləndirmək

**rate** [reıt] *v* II töhmətləndirmək, məzəmmət etmək, danlamaq, dərsini vermək; **to ~ smb. for doing smth.** bir kəsi bir şey etdiyinə görə danlamaq/ məzəmmət etmək; **to ~ at smb.** bir kəsin üstünə qışqırmaq

**ratepayer** [ˈreıt.peıəʳ] *n* vergi verən/ödəyən adam

**rather**[1] [ˈra:ðəʳ] *adv* 1. xeyli, dedikcə, olduqca, müəyyən qədər/dərəcədə; qismən; çox güman; **~ dull /interesting/dark/hot** olduqca maraqsız/maraqlı/qaranlıq/isti; *It's rather cold/hot outside Bayırda dedikcə soyuqdur/istidir; The instructions were rather complicated Təlimat dedikcə dolaşıq idi; This hotel is rather more expensive than the others Bu mehmanxana digərlərindən xeyli bahadır*; 2. yaxşısı budur, üstün tutma; *I would rather go Yaxşısı budur, mən gedim; They determined to die rather than surrender Onlar qərara aldılar ki, ölsünlər amma təslim olmasınlar. Onlar ölməyi təslim olmaqdan üstün tutmağı qət etdilər*

**rather**[2] [ˈra:ðəʳ] *inter* əlbəttə; *Have you been here before? – Rather! Sən/Siz əvvəllər burada olmusanmı/olmusunuzmu? – Əlbəttə!*

**ratification** [.rætıfıˈkeıʃn] *n hüq.* təsdiq, təsdiq etmə/edilmə; ratifikasiya etmə *(dövlətlər arasında bağlanan müqavilənin, paktın və s.-nin ali hökumət orqanı tərəfindən təsdiq edilməsi)*

**ratify** [ˈrætıfaı] *v (pt, pp* **-fied)** təsdiq etmək; imzalamaq; *The heads of the 2 governments met to ratify the treaty İki dövlət başçısı müqaviləni imzalamaq üçün görüşdülər*

**rating** [ˈreıtıŋ] *n* I 1. qiymət, qiymət qoyma/vermə; fikir, rəy; **credit ~** krediti/borcu ödəmə qabiliyyətini qiymətləndirmə; **financial ~** maliyyə vəziyyətini qiymətləndirmə; 2. vergi qoyma; yerli verginin məbləği; 3. normallaşdırma, normallaşdırılma; nizama salma/salınma; 4. sıravi dənizçi; 5. vəziyyət, dərəcə, rütbə; **priority ~** dərəcə növbəsi

**rating** [ˈreıtıŋ] *n* II töhmət, məzəmmət, abırlama, qulaqburması; **to give smb. a ~** bir kəsə qulaqburması vermək

**ratio** [ˈreıʃıou] *n (pl* **-os** [-ouz]) nisbət, əmsal; tənasüb, uyğunluq; proporsiya; **in the ~ of one to six** birin altıya nisbəti; *The ratio of women to men in the factory is three to one Zavodda/Fabrikdə qadınların kişilərə nisbəti üçün birə nisbətidir*

**ratiocinate** [.rætıˈɔsıneıt] *v* düşünmək, fikirləşmək, mühakimə yürütmək; fikir söyləmək; ağılla əsaslandırmağa çalışmaq

**ration**[1] [ˈræʃn] *n* 1. rasion, pay, yem miqdarı, ərzaq payı; **the weekly butter/ meat/bread** *etc.* **~** həftəlik yağ/ət/çörək *və s.* payı; 2. ehtiyat; **iron/emergency ~** toxunulmaz ehtiyat; **~ of floor space** mənzil sahəsinin payı; 3 *pl* ərzaq, azuqə; **to be on short ~** ərzaq çatışmazlığı hiss etmək

**ration**[2] [ˈræʃn] *v* 1. pay vermək; **to ~ (out) bread** çörək vermək *(pay olaraq)*; 2. ərzaqla/azuqə ilə təmin etmək; *The army is well rationed Ordu ərzaqla yaxşı təmin edilir*; 3. normalaşdırmaq, kartoçka üzrə bölüşdürmək; *Bread was rationed Çörək kartoçka ilə verilirdi*

**rational** [ˈræʃnəl] *adj* 1. şüurlu, düşüncəli, düşünən; **~ beings** düşünən/şüurlu varlıqlar, insanlar, adamlar; *Man is a rational creature İnsan şüurlu varlıqdır*; 2. ağıllı, kamallı, dərrakəli, mühakiməli; məqsədəuyğun, ağlabatan; səmərəli; **~ argument** ağıllı/məqsədəuyğun arqument/dəlil; **a ~ act** ağıllı/ məqsədəuyğun hərəkət; **a ~ method** səmərəli metod; **a ~ conduct/behaviour** ağıllı/kamallı davranış; **~ explanation** ağıllı/ağlabatan/məqsədəuyğun izahat; 3. *fəls.* rasionalist; **~ theology** rasionalist ilahiyyat *(dini nəzəriyyələr)*; 4. əqli, zehni; **~ faculty** əqli qabiliyyət; **~ powers** əqli/zehni bacarıqlar; 5. rahat; **~ footwear** rahat ayaqqabı

**rationale** [.ræʃəˈna:l] *n* 1. məntiqi/ağıllı əsas/dəlil; ağıllı izahat; *What is the rationale behind this decision? Bu qərarın arxasında hansı ağıllı /məntiqi dəlil/əsas durur?*; 2. əsas/əsl səbəb; **the ~ of the law** qanunun əsası

**rationalism** [ˈræʃnəlızm] *n fəls.* rasionalizm *(təfəkkürü duyğu qavrayışından ayıran və əqli yeganə idrak vasitəsi hesab edən fəlsəfi cərəyan)*

**rationalist**[1] [ˈræʃnəlıst] *n fəls.* rasionalist, rasionalizm tərəfdarı

**rationalist**[2] [ˈræʃnəlıst] *adj* rasionalist; **~ theories** rasionalist nəzəriyyələri

**rationality** [.ræʃəˈnælıtı] *n* 1. səmərəlilik; ağıllılıq; şüurluluq; məntiqlilik; 2. əqli normallıq; 3. rasionalizm

**rationalization, -isation** [.ræʃnəlaıˈzeıʃn] *n* 1. ağıllı/məntiqi izahat, məntiqi əsaslandırma; 2. səmərələşdirmə, təkmilləşdirmə

**rationalize, -ise** [ˈræʃnəlaız] *v* 1. əsaslı/ ağıllı izahat vermək, məntiqi cəhətdən əsaslandırmaq; 2. səmərələşdirmək, yaxşılaşdırmaq; təkmil-

ləşdirmək; **to ~ the factory's production** fabrikin/zavodun məhsulunu yaxşılaşdırmaq
**rationalizer** ['ræʃnəlaɪzəʳ] *n* səmərələşdirici
**rationally** ['ræʃnəlɪ] *adv* 1. ağıllı, ağılla, ağıl ilə, məntiqlə, düşünərək; 2. səmərəli, səmərəli surətdə
**rattle¹** ['rætl] *n* 1. cingilti, şaqqıltı, gurultu, səs-küy; cırıltı, cır-cır səsi, şaqqıltı, gumbultu; tıqqıltı; **the ~ of bottles/chains** butulkaların/zəncirlərin cingiltisi; **the ~ of hail on the roof** dolunun evin damında tıqqıltısı; 2. şax-şax *(uşaq oyuncağı)*; zınqırov; 3. gəvəzə, boşboğaz, hərzə, çərənçi, naqqal; 4. xırıltı, ölümqabağı xırıltı; 5. *zool.* zınqırovlu ilan
**rattle²** ['rætl] *v* 1. cırtıldamaq, cırıldamaq; guruldamaq, partıldamaq, gumbuldamaq; gurultu salmaq; *The wind was rattling the windows Külək pəncərələri cırıldadırdı; The windows were rattling in the wind Pəncərələr küləkdən cırıldayırdı*; **to ~ along/off** gurultu ilə keçib getmək; *The old bus rattled along the stony road Köhnə avtobus daşlı yolla gurultu ilə keçib getdi*; **to ~ away/on** çərənçilik etmək; *He rattled on for hours about his job O, işi haqqında saatlarla çərənlədi*; **to ~ through *smth.*** bir işi/şeyi tez etmək; *We rattled dinner in 20 minutes Biz naharı 20 dəqiqəyə (tələsik) qurtardıq*; 2. xırıldamaq *(ölən adam haq.)*: *The dying man rattled in his throat Ölən kişi (boğazında) xırıldayırdı*
**rattlesnake** ['rætlsneɪk] *n zool.* zınqırovlu ilan
**rattle-brain** ['rætlbreɪn] *n* başıboş, axmaq, sarsaq, səfeh *(adam)*
**rattle-brained** ['rætlbreɪnd] *adj* başıboş, axmaq, sarsaq, beyinsiz, ağılsız, gic
**rattle-headed** ['rætl.hedɪd] *adj* = **rattle-brained**
**rattling** ['rætlɪŋ] *adj* 1. gurultulu, cingiltili; səsli-küylü; 2. güclü, şiddətli *(külək haq.)*; 3. *d.d.* tez, cəld *(yeriş və s. haq.)*; 4. çox gözəl/yaxşı, əla; **to have a ~ time** çox gözəl/əla vaxt keçirmək
**rat-trap** ['rættræp] *n* 1. siçovul tələsi; 2. *məc.* tələ, tor, çıxılmaz vəziyyət
**ratty** ['rætɪ] *adj* 1. siçovul çox/bol olan; siçovullu; 2. acıqlı, hirsli; qəzəbli; 3. səliqəsiz, pırtlaşıq; **long ~ hair** uzun səliqəsiz/pırtlaşıq saç
**raucity** ['rɔ:sɪtɪ] *n* xırıltı, xırıldama; tutqunluq, batıqlıq *(səsdə)*
**raucous** ['rɔ:kəs] *adj* xırıltılı, boğuq, tutqun, fısıltılı *(səs haq.)*
**ravage¹** ['rævɪdʒ] *n* viran edilmə/etmə, xaraba qoyma, dağıdılma, bərbad etmə/edilmə; məhv etmə, kökünü kəsmə; **~ of weeds** alaq otlarının kökünü kəsmə
**ravage²** ['rævɪdʒ] *v* 1. viran/məhv/talan etmək, xaraba qoymaq; boşaltmaq; dağıtmaq; **to ~ a country/a city** ölkəni/şəhəri talan etmək; 2. xarab olmaq, korlanmaq
**rave¹** [reɪv] *n* 1. sayaqlama, sərsəmləmə; rabitəsiz /əlaqəsiz nitq; 2. gurultu, uğultu *(külək, dəniz haq.)*; azğınlıq, qudurğanlıq *(təbii fəlakət haq.)*
**rave²** [reɪv] *v* 1. sayıqlamaq, sərsəmləmək; rabitəsiz danışmaq; **to ~ in fever** qızdırma içərisində sayıqlamaq; *He raved all night in his fever O, bütün gecə qızdırma içərisində sayıqladı; You're raving! Sən/Siz sayıqlayırsan!/sayıqlayırsınız!*; 2. **(about, of)** məftun/ heyran/valeh olmaq; **to ~ about *smb.*'s beauty** bir kəsin gözəlliyinə məftun/ heyran/valeh olmaq; 3. **(about, of, against)** qəzəblənmək, qeyzlənmək, hiddətlənmək, acıqlanmaq; lənətləmək; **to ~ against one's fate** taleyini lənətləmək; **to be raving with anger/ with fury** qəzəbdən özündə olmamaq; 4. coşmaq, azğınlıq/ qudurğanlıq etmək *(tufan, dəniz haq.)*, vıyıldamaq, guruldamaq, şiddət etmək *(külək və s. haq.)*; *The wind raves through the mountains Külək dağlarda vıyıldayır/ şiddət edir*
**ravel¹** ['rævl] *n* 1. qarışıqlıq, dolaşıqlıq; 2. sap qırıntısı; 3. *top.i* sap qırıntıları, dolaşıq yumaq/kələf
**ravel²** ['rævl] *v* (-ll-) 1. pırtlaşdırmaq, dolaşdırmaq, dolaşıq/pırtlaşıq salmaq *(sapı, ipi və s.)*; 2. *məc.* dolaşdırmaq, qarışdırmaq, mürəkkəbləşdirmək *(məsələni və s.)*; **to ~ out** açmaq *(sapı)*; liflərə ayırmaq
**raven¹** ['reɪvn] *n zool.* alaqarğa
**raven²** ['reɪvn] *adj* qara və parlaq; **silky ~ hair** qara parlaq ipək saç
**ravening** ['rævənɪŋ] *adj* yırtıcı, vəhşi acgöz *(xüs. heyvanlar haq.)*; **~ wolves** yırtıcı/acgöz canavarlar
**ravenous** ['rævənəs] *adj* 1. bərk ac; *When's dinner? I'm ravenous Nahar haçan/nə vaxt olacaq? Mən bərk acam/acından ölürəm*; 2. iti, acgöz, doymaq bilməyən; **a ~ appetite** iti iştaha, canavar iştahası
**ravenously** ['rævənəslɪ] *adv* acgözlüklə, acgözcəsinə; **to eat ~** acgözlüklə yemək
**ravine** [rə'vi:n] *n* dərə, yarğan, çuxur; keçid *(dağda)*
**ravish** ['rævɪʃ] *v* 1. *(xüs. məchulda işlənir)* məftun/heyran/valeh etmək; **to ~ *smb.* by *smth.*** bir kəsi bir şeylə heyran/valeh etmək; *She was ravished by the beauty of the music O, musiqinin gözəlliyindən valeh/məftun olmuşdu*; 2. zorlamaq *(qadını, qızı)*
**ravishing** ['rævɪʃɪŋ] *adj* valehedici, heyranedici, məftunedici, çox gözəl, cəzbedici, cazibəli; **a ~ smile** valehedici /heyranedici/məftunedici təbəssüm
**ravishingly** ['rævɪʃɪŋlɪ] *adv* füsunkarcasına, füsunkaranə, çox qəşəng/gözəl; cazibəli/cəzbedici/məlahətli bir tərzdə; **~ beautiful** füsunkarcasına gözəl
**ravishment** ['rævɪʃmənt] *n* 1. qaçırma, oğurlama *(adət. qızı, qadını)*; 2. zorlama *(qızı, qadını)*; 3. məftunluq, heyranlıq, coşğunluq
**raw¹** [rɔ:] *n* xammal
**raw²** [rɔ:] *adj* 1. çiy, bişməmiş, bişirilməmiş; **~ meat/potato/fish/ vegetable** çiy ət/kartof/balıq/tərəvəz; 2. çiy, qaynadılmamış; **~ brick** *tik.* çiy kərpic; **~ milk/water** qaynadılmamış süd/su; 3. xam, təmizlənməmiz; **~ material** xammal; **~ oil** xam/təmizlənməmiş neft; **~ silk** xam ipək; **~ cotton** çiyidli/çiyiddən təmizlənməmiş pambıq; **~ rice** çəltik, döyülməmiş/qabığı alınmamış düyü; 4. qatılmamış, təmiz; **~ whisky /vodka** təmiz viski/araq; 5. öyrənməmiş, xam; **a ~ hand** xam/işə öyrənməmiş əl; 6. dərisi soyulmuş; qanı axan, təzə; **~ wound** təzə yara; 7. rütubətli, nəm, yağmurlu *(hava haq.)*; **a ~ foggy morning** rütubətli dumanlı səhər; **a ~ day** yağmurlu gün; 8. kobud, qaba, primitiv *(incəsənət və s. haq.)*; 9. *amer.* çılpaq, lüt; **to walk around ~** çılpaq/lüt gəzmək; 10. *amer. d.d.* ədəbsiz, nalayiq; yaramaz; **to pull a ~ one** ədəbsiz/nalayiq lətifə danışmaq;
◊ **~ head and bloody bones** 1) kəllə və çarpazlaşdırılmış sümüklər; 2) uyuq, qorxuluq; qorxu yaratmaq/törətmək vasitəsi *(xüs. uşaqlarda)*; **to swim in the ~** lüt/çılpaq çimmək; **to present life in the ~** həyatı olduğu kimi vermək/təqdim etmək
**raw-boned** ['rɔ:bound] *adj* çox arıq, bir dəri bir sümük; **a ~ face** çox arıq sifət/üz
**rawhide** ['rɔ:haɪd] *adj* xam göndən/dəridən qayrılmış/hazırlanmış; **a ~ whip** xam göndən qayrılmış qamçı/şallaq
**ray¹** [reɪ] *n* I 1. şüa; **the ~s of the sun** günəşin şüaları; **a ~ of light** işığın şüası; 2. *fiz.* şüa, şüalanma; **alpha/beta/gamma ~s** alfa/beta/qamma şüaları
**ray** [reɪ] *n* II *zool.* skat *(sivri quyruqlu, yastı bədənli iri yırtıcı balıq)*
**ray²** [reɪ] *v* 1. şüa buraxmaq/saçmaq/ yaymaq; şüalanmaq, yayılmaq *(şüa, işıq və s. haq.) (həm də* **to ~ out/forth**); 2. işığa salmaq/vermək
**raze** [reɪz] *v* 1. tamamilə dağıtmaq/yıxmaq, uçurtmaq; viran/alt-üst etmək; **to ~ to the ground** yer üzündən götürmək, külünü göyə sovurmaq, yerlə yeksan etmək *(şəhər, ölkə və s. haq.)*: *During the war, whole villages were razed to the ground Müharibə zamanı bütöv kəndlər yerlə yeksan oldu/edildi*; 2. **(out)** silmək, pozmaq; **to ~ out a word** sözü pozmaq/ silmək
**razor** ['reɪzəʳ] *n* ülgüc; **an electric ~** elektrik ülgücü
**razor-grinder** ['reɪzə.graɪndəʳ] *n* ülgücitiləyən
**razz** [ræz] *v* cırnatmaq, ələ salmaq, masqaraya/lağa qoymaq, istehza etmək
**re-** [ri:-] *pref Əsasən fel köklərindən yeni söz düzəldir. Hərəkətin yenidən icra edilməsini bildirir: Bu halda o, Azərbaycan türkcəsinə* **yenidən, yeni** *sözləri ilə tərcümə edilir:* to rewrite **yenidən** yazmaq, to reread **yenidən** oxumaq; to rename **yeni** ad vermək
**reach¹** [ri:tʃ] *n* 1. uzatma *(əlini və s.)*; **to make a ~ for *smth.*** bir şeyə əl uzatmaq; **within ~ of *one's* hand** əlinin altında; 2. əl çatma, mümkünlük; mümkün olma; **within ~** əl çatma; **beyond/out of ~** əl çatmama; 3. əhatə; səviyyə *(bilik və s. haq.)*; *Such subtleties are beyond/out of my reach Belə incəlikləri mən anlaya bilmirəm*; 4. məkan, sahə; **~ of meadow** çəmənliyin sahəsi; **the ~es of the valley** dərənin genişliyi/sahəsi; 5. dirsək *(çayda)*; **the upper/lower ~es of the Thames** Temzanın yuxarı/aşağı dirsəkləri
**reach²** [ri:tʃ] *v* 1. uzatmaq *(xüs. əli)*; **to ~ forth *one's* arms** əllərini qabağa uzatmaq; *A tree reaches (out) its boughs towards the light Ağac budaqlarını işığa doğru uzadır*; 2. uzanmaq; *Boughs reach out towards the sun Budaqlar günəşə doğru uzanır*; 3. **(after)** can atmaq, canfəşanlıq göstərmək, axtarmaq, çalışmaq; **to ~ after fame** şöhrətə can atmaq, şöhrət axtarmaq; **to ~ at** tutmaq, yapışmaq, qarmalamaq, qapışdırmaq; **to ~ up** yuxarı qaldırmaq
**reachable** ['ri:tʃəbl] *adj* mümkün, mümkün olan, əldə edilə bilən, əl çatan
**react** [rɪ'ækt] *v* 1. reaksiya/cavab vermək *(təsirə)*; *I suggested that he might help, but he didn't react at all Mən belə hesab etdim ki, o, kömək edə bilər, lakin o, buna əsla reaksiya vermədi*; 2. **(on, upon)** təsir etmək/göstərmək, təsirlənmək; *The applause reacted upon the orator Alqışlar natiqə təsir etdi*; **to ~ upon each other** bir-birinə təsir etmək, qarşılıqlı təsirlənmək; 3. **(against)** əks-təsir/müqavimət göstərmək, məne olmaq; **to ~ against opposition** müxalifətə əks-təsir göstərmək; **to ~ against environment** şəraitin təsirinə müqavimət göstərmək; 4. *kim.* reaksiyaya girmək
**reaction** [rɪ'ækʃn] *n* I 1. reaksiya, təsirə cavab vermə, təsirlənmə; münasibət göstərmə; **the ~ of eye to light** gözün işığa qarşı reaksiyası; **an artist's ~ to beauty** rəssamın gözəlliyə münasibəti; 2. *d.d.* fikir, rəy, münasibət; **~s to the war in the Far East** Uzaq Şərqdəki müharibəyə münasibətlər: *What's the President's reaction? Prezidentin fikri/ rəyi nəcədir?*; 3. təsir; **the ~ of the rumours on public opinion** şayiələrin ictimai rəyə təsiri; 4. əks-təsir; **action and ~** təsir və əks-təsir; 5. *kim. fiz.* reaksiya; **nuclear ~** nüvə reaksiyası
**reaction** [rɪ'ækʃn] *n* II *siya.* irtica; **forces of ~** irtica qüvvələri; **international ~** beynəlxalq irtica
**reactionary¹** [rɪ'ækʃnərɪ] *n* irticaçı, mürtəce siyasət tərəfdarı, cəhalətpərəst
**reactionary²** [rɪ'ækʃnərɪ] *adj* mürtəce, irticaçı; **~ forces** mürtəce qüvvələr
**reactionist** [rɪ'ækʃnɪst] *n* irticaçı, mürtəce, cəhalətpərəst
**reactivate** [rɪ'æktɪveɪt] *v* 1. yenidən fəaliyyətə başlamaq, fəaliyyəti təzələmək; təzədən təkrar etmək; 2. canlandırmaq *(işi)*; 3. bərpa etmək; 4. reaktivləşdirmək

**reactivation** [rɪ.æktɪ'veɪʃn] *n* 1. fəaliyyəti bərpa etmə; 2. canlandırma, yenidən başlama, təzələmə, təzədən təkrar etmə *(işi)*; 3. bərpa etmə *(təşkilatı)*

**reactive** [rɪ'æktɪv] *adj* 1. təsirə cavab verən; reaksiya verən; 2. qıcığa cavab verən; 3. *kim.* reaktiv

**reactor** [rɪ'æktə^r] *n* 1. *tex.* reaktor *(öz-özündən induksiya əmələ gətirən makara)*; 2. *fiz.* atom reaktoru/qazanı

**read**[1] [ri:d] *n* oxu, kitab oxuma; **to enjoy a good ~** yaxşı kitab oxumadan həzz/ləzzət almaq; **to take a quick ~ at a book** kitabı ötəri oxumaq, kitaba ötəri göz gəzdirmək/nəzər salmaq; *I have a read of your magazine Sənin/Sizin jurnalını/jurnalınızı oxumuşam*

**read**[2] [red] *adj* 1. bilikli, məlumatlı, çox oxumuş/mütaliə etmiş; səriştəli *(müəyyən sahədə)*; **to be well/deeply/little ~ in a subject** hər hansı sahədə yaxşı/dərin/az hazırlığı olmaq; 2. oxunan; **to hear a ~ speech** mətn üzrə oxunan nitqə qulaq asmaq; **the most ~ of all books** ən yaxşı oxunan kitab;

◊ **to take as ~** oxumadan təsdiq etmək

**read**[3] [ri:d] *v (pt, pp* **read** [red]) 1. oxumaq *(kitab və s.)*; **to learn (how) to ~** (necə) oxumağı öyrənmək; **to teach children (how) to ~ and to write** uşaqlara (necə) oxumağı və yazmağı öyrətmək; **to ~ a book/a letter/a newspaper/a magazine** *etc.* kitab/məktub/qəzet/jurnal *və s.* oxumaq; **to ~ Shakespeare/Nizami,** *etc.* Şekspiri/Nizamini və s. oxumaq; **to ~ men's hearts /thoughts** adamların ürəyini/fikrini oxumaq; **to ~ *smth* over again and again** bir şeyi dəfələrlə oxumaq; **to ~ *smth.* out of/from a book** bir şeyi kitabdan oxumaq; *The child can't read and write yet Uşaq hələ oxumağı və yazmağı bacarmır*; **to ~ aloud** ucadan oxumaq; **to ~ oneself** öz-özünə *(yəni səs çıxartmadan)* oxumaq; 2. oxumaq, elan etmək; **to ~ a decision** qərarı oxumaq/elan etmək; 3. deyilmək; göstərilmək; *The document reads as follows Sənəddə aşağıdakı kimi deyilir; This ticket reads to Boston Biletdə Bostona qədər göstərilir*; 4. göstərmək *(cihaz və s. haq.)*; *Thermometer reads 38° today Bu gün termometr 38 dərəcə göstərir; What does the speedometer read? Spidometr neçəni göstərir?*; 5. öyrənmək, məşğul olmaq *(hər hansı fənlə, elm sahəsi ilə)*; **to ~ physics** fizika ilə məşğul olmaq; 6. müzakirə edib təsdiqləmək; *The bill was read the first time Layihə müzakirə edildi və birinci oxunuşda bəyənildi/qəbul olundu*; 7. tapmaq *(tapmacanın cavabını)*; **to ~ a riddle** tapmacanın cavabını tapmaq; 8. xəbər vermək *(gələcəyi, taleyi)*; **to ~ futurity/the future** gələcəkdən xəbər vermək; **to ~ *smb.'s* fortune** bir kəsin taleyindən xəbər vermək; **to ~ through** əvvəldən axıra kimi/qədər oxumaq; **to ~ up** ucadan oxumaq; *Read up! Ucadan oxu/oxuyun!*;

◊ **to ~ *smb.* a lesson/a lecture** bir kəsə öyüd-nəsihət vermək

**readability** [.ri:də'bɪlətɪ] *n* asan oxuna bilmə, oxunuşu asan olma; aydınlıq *(oxumaq üçün)*

**readable** ['ri:dəbl] *adj* 1. aydın, asan oxunan, oxunuşu asan; **~ handwriting** asan oxunan/aydın xətt; 2. oxunaqlı, maraqlı, yaxşı yazılmış *(kitab haq.)*; **a ~ book** oxunaqlı/maraqlı kitab; *The book is simply not readable Kitab sadəcə olaraq oxunaqlı deyil*

**readdress** [.ri:ə'dres] *v* məktubun ünvanını dəyişdirmək/dəyişmək; *She asked me to readdress any mail for her to her new home O, məndən xahiş etdi ki, ona poçtla nə göndərsəm, yeni evinin ünvanını yazım*

**reader** [' ri:də^r] *n* 1. oxucu; *My fair readers! Mənim əziz oxucularım!*; 2. bədii oxucu *(aktyor)*; 3. **Reader** ali məktəb müəllimi, mühazirəçi, dosent; 4. müntəxəbat

**readership** ['ri:dəʃɪp] *n* 1. dosent rütbəsi; dosentura, dosentlik; ali məktəb müəllimi vəzifəsi; 2. oxucu kütləsi; **to achieve a wide ~** geniş oxucu kütləsi qazanmaq/əldə etmək

**readily** ['redɪlɪ] *adv* 1. həvəslə, məmnuniyyətlə, razılıqla; **to consent ~** həvəslə/məmnuniyyətlə razılaşmaq; *His suggestion was readily accepted Onun təklifi məmnuniyyətlə qəbul edildi*; 2. asanlıqla; *She is not readily moved to tears Onu asanlıqla göz yaşı tökməyə vadar etmək olmaz*; 3. tez, cəld, təxirsiz, o saat

**readiness** ['redɪnɪs] *n* 1. hazırlıq; hazırlıq dərəcəsi, razılıq, hazır olma; **to have everything in ~** hər şeyi hazır vəziyyətdə saxlamaq; 2. zireklik, hazırcavablıq, diribaşlıq; tezlik, itilik; **~ of speech** natiqlik bacarığı; 3. hazır/razı olma, razılıq; **~ to undertake a task** öhdəlik/ öhdəçilik götürməyə hazır olma, tapşırıq qəbul etməyə hazır olma

**reading**[1] ['ri:dɪŋ] *n* 1. oxu, oxuma; qiraət; **outside ~** sinifdənkənar oxu; **to teach ~ and writing** oxumağı və yazmağı öyrətmək; **to be fond of ~** oxumağı (çox) sevmək; **to be busy with ~ for *one's* exams** imtahana hazırlaşmaq; 2. məlumatlılıq, xəbərdarlıq, biliklilik, erudisiya; **a man of wide ~** erudit *(hər hansı bir sahədə geniş məlumatı olan adam)*, geniş məlumata sahib olan adam; 3. mətni formalaşdırma; mətnin variantı; 4. izah/şərh/təfsir etmə; anlatma; yazma; *What's your reading of the fact? Sən/Siz bu faktı necə izah edirsən?/edirsiniz?*

**reading**[2] ['ri:dɪŋ] *adj* 1. oxu, oxucu *(kitab, qəzet və s.)*; **the ~ public** oxucu kütləsi; **~ conference** oxucu konfransı; 2. oxu üçün; **~ matter** ədəbiyyat, oxu üçün material *(kitab, qəzet və s.)*

**reading-book** ['ri:dɪŋbuk] *n* müntəxəbat, oxu üçün mətnlər məcmuəsi/toplusu

**reading-lamp** ['ri:dɪŋlæmp] *n* stolüstü lampa

**reading-room** ['ri:dɪŋrum] *n* 1. qiraətxana, oxu zalı; 2. korrektor otağı



**readjust** ['ri:ə'dʒʌst] *v* 1. düzəltmək, qaydaya salmaq, təzədən düzəltmək/ qayırmaq; dəyişdirmək; **to ~ the television set** televiziya aparatını düzəltmək; **to ~ *one's* dress** paltarını düzəltmək/qaydaya salmaq; 2. uyğunlaşmaq *(yenidən)*; **to ~ oneself to civil life** mülki həyata uyğunlaşmaq *(məs. əsgərlikdən sonra)*

**readjustment** ['ri:ə'dʒʌstmənt] *n* 1. düzəltmə, düzəldilmə; dəyişdirilmə; qaydaya salınma; **to make ~** düzəliş etmək; 2. kökləmə *(televizoru, çalğı alətlərini)*; 3. yenidən qurma/tikmə/təşkil etmə; 4. mülki həyata qayıtma *(əsgərlikdən tərxis olunduqdan sonra)*

**ready**[1] ['redɪ] *n (adət.* **the ~, readies)** 1. *d.d.* nağd pul; 2. *hərb.* hazır vəziyyət; **at the ~** hazır vəziyyətdə; **to have the gun at the ~** silahı hazır vəziyyətdə tutmaq

**ready**[2] ['redɪ] *adj* (**-ier, -iest**) 1. hazır, hazırlanmış; **~ for use** istifadəyə hazır; **~ for the press** çap üçün hazır *(əlyazması haq.)*; *Dinner is ready Nahar hazırdır; The car is ready Maşın hazırdır; Are you ready for the journey? Səyahətə hazırsanmı?/hazırsınızmı?*; **to make/to get ~** hazırlaşmaq, hazır etmək; **to get the children ~ for a walk** uşaqları gəzintiyə aparmaq üçün hazırlamaq; *Get ready quickly! Tez hazır ol! /olun!*; **to be ~ to go home** evə getməyə hazır olmaq; 2. hazır, hazır vəziyyət; **to keep a pistol ~** tapançanı hazır vəziyyətdə tutmaq; 3. yüngül, tez, cəld; **~ solubility in water** suda tez ərimə; 4. nağd; **~ money/cash** nağd pul; **to pay ~ money** nağd pulla ödəmək/hesablaşmaq

**ready**[3] ['redɪ] *adv* hazır vəziyyətdə; *The boxes are ready packed Qutular qablanıb, hazırdır*

**ready-made** ['redɪ'meɪd] *adj* hazır; **~ clothes** hazır paltar; **a ~ shop** hazır paltar satan mağaza

**real** ['rɪəl] *adj* 1. həqiqi, əsl, real, gerçək; **~ events** həqiqi/real hadisələr; **a ~ man** həqiqi adam; **~ gold/silver** həqiqi qızıl/ gümüş; **a ~ reason** həqiqi/əsl səbəb; *These things are real and no fancies Bu şeylər həqiqidir, heç biri uydurma deyil*; 2. təbii, həqiqi; **~ silk** təbii/həqiqi ipək; **~ and paper flowers** təbii və kağızdan düzəldilmiş çiçəklər; **~ friend** həqiqi dost; 3. *siya.* həqiqi; **~ value** həqiqi dəyər; **~ wages** həqiqi maaş/əmək haqqı; 4. *hüq.* daşınmaz, tərpənməz; **~ property** daşınmaz/tərpənməz əmlak; 5. *fəls.* maddi, obyektiv mövcud olan; 6. həqiqi, əsl; **~ beauty** əsl gözəllik;

◊ **the ~ thing** əsl şey, lazım olan şey; **~ money** 1) sikkə, dəmir pul; 2) nəqd pul

**realism** ['rɪəlɪzm] *n* realizm

**realist** ['rɪəlɪst] *n* realist

**realistic** ['rɪəlɪstɪk] *n* realist; **~ planning** realist planlaşdırma; **~ attitude** realist münasibət; **~ view** realist fikir

**realistically** [rɪə'lɪstɪkəlɪ] *adv* realistcəsinə, praktik olaraq

**reality** [rɪ'ælɪtɪ] *n* 1. gerçəklik, varlıq, reallıq; **objective ~** *fəls.* obyektiv varlıq; **in ~** əslində, faktik olaraq, həqiqətdə, işdə; *She believes in reality of fairies O əslində cadugərlərin mövcud olmasına/varlığına inanır*; 2. fakt, dəlil, sübut; *We must stick to the realities Biz faktlara /sübutlara əsaslanmalıyıq*; 3. həqiqilik, doğruluq, inam; **belief in the ~ of miracles** möcüzələrin varlığına inam; **to become a ~** həqiqətə çevrilmək; *This dream will soon become a reality Bu arzu tezliklə həqiqətə çevriləcək /həqiqət olacaq*

**realizable, -isable** ['rɪəlaɪzəbl] *adj* həyata keçirilə bilən, mümkün olan; yerinə yetirilə/həyata keçirilə bilən; **a ~ plan** yerinə yetirilə bilən plan

**realization, -isation** [.rɪəlaɪ'zeɪʃn] *n* 1. həyata keçmə/keçirilmə, yerinə yetirmə/ yetirilmə; realizasiya, reallaşdırma, həyata keçirmə *(planı və s.)*; **the ~ of *one's* hopes/dreams** ümidlərini/ arzularını həyata keçirmə; 2. şüur, düşüncə, idrak; anlama, başa düşmə/ düşülmə, qanma; dərk etmə; **to have a true ~ of danger** təhlükəni aydın dərk etmə/başa düşmə; **to have a true ~ of *one's* position** öz vəziyyətini düzgün başa düşmə/anlama; 3. satış, realizə etmə; **~ of goods** malların satışı/realizə edilməsi

**realize, -ise** ['rɪəlaɪz] *v* 1. həyata keçirmək, yerinə yetirmək; reallaşdırmaq; **to ~ a plan** planı həyata keçirmək/yerinə yetirmək; **to ~ *one's* dreams/hopes** öz arzularını/ümidlərini yerinə yetirmək; *Our hopes were realized Bizim ümidlərimiz reallaşdı/həqiqətə çevrildi*; 2. başa düşmək, dərk etmək, anlamaq; **to ~ the difficulties** çətinlikləri başa düşmək/dərk etmək; **to ~ *one's* error** səhvini başa düşmək/anlamaq; 3. aydınlaşdırmaq, aydın etmək; *These details help to realize the question Bu təfərrüatlar məsələni aydınlaşdırmağa kömək edir*; 4. *tic.* satmaq, realizə etmək; *The goods are difficult /easy to realize Bu malları satmaq çətindir /asandır*

**really**[1] ['rɪəlɪ] *adv* 1. həqiqətən, həqiqətdə, doğrudan da, əslində; *What do you really think about it? Sən/Siz əslində bu barədə nə düşünürsən?/düşünürsünüz?*; **things that ~ exist** həqiqətən mövcud olan şeylər; 2. çox, olduqca, son dərəcə; müstəsna dərəcədə; **a ~ hot/cold day** olduqca isti/soyuq gün; **a ~ beautiful woman /girl** son dərəcə gözəl qadın/qız

**really**[2] ['rɪəlɪ] *inter Təəccüb, narazılıq, şübhə və s. ifadə edir. Doğrudanmı? Ola bilməz! Nə danışırsan!* və s.; *We are going to Japan next month – Really? Biz gələn ay Yaponiyaya gedirik –Doğrudanmı? Ola bilməz?*;

◊ **~ and truly** düzü, doğrusu, həqiqətən, doğrudan da, doğrudan-doğruya; *Really and truly, he must not say such things Düzü, o belə şeylər deməməlidir*

**realm** [relm] *n* 1. krallıq; dövlət; 2. *şair.* hökmranlıq; **the ~ of nature** təbiətin hökmranlığı; 3. sahə; **the ~ of science** elmin sahəsi

**reap[1]** [ri:p] *n* dərz; qucaq *(ot və s. haq.)*

**reap[2]** [ri:p] *v* 1. biçmək; məhsul yığmaq; **to ~ corn/wheat/barley** taxıl/buğda/arpa biçmək; 2. bəhrəsini/səmərəsini görmək; **to ~ the fruits of a victory** qələbənin bəhrəsini/səmərəsini görmək; ◊ *To reap as one has sown at. söz. Nə əkərsən, onu da biçərsən; Nə tökərsən aşına, o da çıxar qaşığına*; **to ~ where one has not sown** başqasının zəhmətinin bəhrəsini görmək, başqasının zəhmətindən bəhrələnmək

**reaper** [ˈri:pəʳ] *n* 1. biçinçi; 2. taxılbiçən maşın

**reappear** [ri:əˈpɪəʳ] *v* yenidən görünmək/ peyda olmaq/zühur etmək; *After a few minutes John reappeared with a tray Bir neçə dəqiqədən sonra Con podnosla yenidən göründü*; *The moon reappeared from behind a cloud Ay buludun arxasından yenidən göründü/peyda oldu*

**reappearance** [ˈri:əˈpɪərəns] *n* yenidən görünmə/peyda olma/zühur etmə; **the ~ of the symptoms** əlamətlərin/ simptomların yenidən peyda olması

**rear[1]** [rɪəʳ] *n* 1. arxa; arxa cəbhə, cəbhə arxası; **in the ~** arxa cəbhədə; **to take in (the) ~** *hərb.* 1) arxa cəbhədən hücum etmək; 2) arxa cəbhəyə keçmək; **to follow in the ~** arxada getmək; quyruqda sürünmək; 2. arxa/dal tərəf; **the ~ of a house** evin arxa/dal tərəfi; 3. *kob.* sağrı, dal; ◊ *To the rear, march! Geriyə marş!*

**rear[2]** [rɪəʳ] *adj* 1. dal, arxa; **~ wheel** dal/arxa təkər; **~ entrance** dal/arxa giriş; 2. *hərb.* arxa; **~ boundary** arxa sərhəd

**rear[3]** [rɪəʳ] *v* 1. qaldırmaq *(başı, əli)*; **to ~ one's head** başını qaldırmaq; *Counterrevolution reared its head Əksinqilab baş qaldırdı*; **to ~ one's voice** səsini qaldırmaq/ucaltmaq; 2. ucaltmaq, dikəltmək, tikmək; **to ~ a monument** abidə ucaltmaq; **to ~ a cathedral** came/baş kilsə tikmək; 3. becərmək, yetişdirmək *(heyvanı)*; **to ~ poultry/pigs** quşçuluqla/donuzçuluqla məşğul olmaq; 4. böyütmək, tərbiyə etmək *(nəsil)*; 5. yönəltmək *(nəzəri və s.)*

**rearrange** [ˈri:əˈreɪndʒ] *v* 1. qaydaya salmaq, düzəltmək; 2. yerini dəyişdirmək, başqa yerə qoymaq; 3. yenidən qurmaq/tikmək/təşkil etmək

**rearrangement** [ˈri:əˈreɪndʒmənt] *n* 1. qaydaya /nizama salma; 2. başqa yerə qoyma, yerini dəyişdirmə; 3. yenidən qurma/təşkil etmə, dəyişdirib düzəltmə

**reason[1]** [ˈri:zn] *n* I 1. səbəb; **the ~ of eclipses** tutulmanın *(ay, günəş)* səbəbi; *What's his reason for leaving the job Onun işdən çıxmasının səbəbi nədir? The reason for the flood was all that heavy rain Daşqının səbəbi o güclü yağış idi, Daşqına səbəb o güclü yağış oldu; What is the reason of the rain/of the dew? Yağışın/Şehin səbəbi nədir?*; 2. əsas; mülahizə; *I saw a reason to suspect him Ondan şübhələnməyə mənim əsasım vardı*

**reason** [ˈri:zn] *n* II 1. dərrakə, idrak; *Only man has reason Ancaq insanlarda dərrakə/idrak var*; 2. ağıl, düşüncə; **to lose *one's* ~** ağlını itirmək, dəli olmaq; **to bring *smb.* to ~** bir kəsi ağıllandırmaq, bir kəsin başına ağıl qoymaq; **to speak/to talk ~** ağılla/düşüncə/dərrakə ilə danışmaq, şüurlu danışmaq

**reason[2]** [ˈri:zn] *v* 1. fikirləşmək, düşünmək, götür-qoy/mühakimə etmək, nəticə çıxarmaq, nəticəyə gəlmək; **to ~ about/ of a subject** hər hansı bir mövzu haqqında fikirləşmək; **to ~ from premises** mühakimədən məntiqi nəticə çıxartmaq; **to ~ from past experience** keçmiş təcrübədən nəticə çıxartmaq; *The ability to reason makes man different from animals Düşünmək qabiliyyəti insanı heyvanlardan fərqləndirir*; 2. müzakirə etmək; **to ~ what is to be done** nə etməli olmağı müzakirə etmək; 3. **(with, into)** inandırmaq, yola gətirmək, dilə tutmaq; *We reasoned with him for an hour Biz onu bir saata inandırdıq/yola gətirdik*; **to ~ *smb.* into doing *smth.*** bir kəsi bir şeyi etmək üçün dilə tutmaq/yola gətirmək; **to ~ *smb.* into accepting a proposal** bir kəsi təklifi qəbul etmək üçün yola gətirmək; 4. əsaslandırmaq, sübut etmək; *He must reason his case a bit more O öz mövqeyini bir az da əsaslandırmalıdır*; **to ~ away** məntiqlə rədd etmək; **to ~ out** ətraflı fikirləşmək, götür-qoy etmək; **to ~ out the answer to a problem** problemi məntiqlə həll etmək

**reasonable** [ˈri:znəbl] *adj* 1. ağıllı, şüurlu, dərrakəli; məntiqə uyğun; səmərəli; ehtiyatlı; **a ~ conclusion** ağıllı/məntiqə uyğun nəticə; 2. əsaslandırılmış, əsaslı; inandırıcı; **~ claim /demand** əsaslı tələb; 3. məqbul, münasib, qəbul oluna bilən; iddiasız, mülayim; **to be ~ in *one's* desires** arzularında iddiasız olmaq, mümkün olmayanı tələb etməmək; **a ~ price** münasib qiymət; 4. *d.d.* ucuz, münasib qiymətli; *Strawberries are reasonable now Çiyələk indi ucuzdur*

**reasonably** [ˈri:znəblɪ] *adv* 1. ağılla, ağıl ilə, məntiqlə, düşünərək; **to discuss the problem calmly and ~** problemi soyuqqanlılıqla və ağılla müzakirə etmək; 2. münasib qaydada/surətdə

**reasoned** [ˈri:znd] *adj* əsaslandırılmış, məntiqi; **a ~ statement** əsaslandırılmış bəyanat

**reasoning** [ˈri:znɪŋ] *n* 1. mühakimə, düşüncə, fikir; **power of ~** mühakimə yürütmək qabiliyyəti; 2. əsaslandırma, sübut göstərmə, dəlil gətirmə; izah etmə

**reasonless** [ˈri:znlɪs] *adj* 1. ağılsız, düşüncəsiz; 2. mənasız, boş; 3. əsaslandırılmamış, əsassız, dəlilsiz, sübutsuz, səbəbsiz

**reassemble** [ˌri:əˈsembl] *v* 1. yenidən görüşmək/yığışmaq; 2. *tex.* söküb yığmaq /quraşdırmaq *(maşını və s.)*



**reassert** [ˌri:əˈsə:t] *v* 1. təsdiq etmək, doğru olduğunu sübut etmək; 2. yenidən irəli sürmək *(ittihamı)*

**reassure** [ˌri:əˈʃuəʳ] *v* 1. təsdiq etmək, inandırmaq; 2. sakitləşdirmək; ürəkləndirmək, ürəkdirək vermək, cürətləndirmək, cəsarətləndirmək; **to ~ the public** ictimaiyyəti sakitləşdirmək; **to feel ~d** özünü arxayın hiss etmək; 3. sığorta etmək, sığortanı təzələmək

**reassuring** [ˌri:əˈʃuərɪŋ] *adj* sakitləşdirici; təskinedici, sakitedici; təsəlliverici; fərəhləndirici, sevindirici; **~ news** təskinedici/təsəlliverici xəbər; **a ~ voice** sakitləşdirici/sakitedici səs; **a ~ glance** təskinedici baxış; **a ~ word** fərəhləndirici söz

**reassuringly** [ˌri:əˈʃuərɪŋlɪ] *adv* sakitləşdirici/təskinedici/təsəlliverici bir tərzdə; fərəhləndirici/seveindirici bir surətdə

**reawaken** [ˌri:əˈweɪkn] *v* yenidən canlandırmaq, oyatmaq/fəallaşdırmaq; **to ~ interest** yenidən maraq oyatmaq; **to ~ memories** xatirələri yenidən oyatmaq/ canlandırmaq

**rebate** [ˈri:beɪt] *n tic.* güzəşt, güzəşt etmə; **to grant a ~** güzəşt etmək

**rebel[1]** [ˈrebl] *n* üsyançı; qiyamçı, üsyankar, iğtişaşçı *(adam)*

**rebel[2]** [ˈrebl] *adj* 1. üsyançı; **the ~ army** üsyançı ordu; 2. qiyamçı, üsyankar; **~ forces** qiyamçı/üsyankar qüvvələr

**rebel[3]** [rɪˈbel] *v (-ll-)* **(against)** 1. qiyam/üsyan etmək; *The troops rebelled Ordu qiyam qaldırdı; The tribes rebelled against their oppressors Qəbilələr öz müstəbidlərinə /zülmkarlarına qarşı üsyan etdilər*; 2. etiraz etmək, müqavimət göstərmək, rədd etmək, əleyhinə çıxmaq; **to ~ against the old custom** köhnə adəti/ ənənəni rədd etmək

**rebellion** [rɪˈbeljən] *n* 1. üsyan; qiyam, bunt, iğtişaş; **armed ~** silahlı üsyan/ qiyam; **to rise in ~** üsyan etmək, qiyam/ bunt qaldırmaq; 2. tabe olmama, müqavimət göstərmə, əleyhinə çıxma; **~ against parents** valideynlərə tabe olmama

**rebellious** [rɪˈbeljəs] *adj* 1. üsyançı, qiyamçı, qiyam etmiş; **~ troops** qiyamçı/qiyam etmiş ordu; 2. üsyankar; **~ speech** üsyankar nitq; 3. itaətsiz, itaət etməyən, tabe olmayan, boyun əyməyən; sözə baxmayan/qulaq asmayan; tərs; **a ~ child** sözə baxmayan/qulaq asmayan/tərs uşaq; 4. gurultulu, həyəcanlı; **~ meetings** gurultulu/həyəcanlı mitinqlər; 5. keçməyən, müalicə olunmayan *(xəstəlik haq.)*

**rebelliously** [rɪˈbeljəslɪ] *adv* üsyankarcasına, üsyankar bir tərzdə; həyəcanlı, gurultulu

**rebelliousness** [rɪˈbeljəsnɪs] *n* üsyankarlıq; coşğunluq

**rebind[1]** [ˈri:ˈbaɪnd] *n* yenidən cildlənmiş kitab

**rebind[2]** [ˈri:ˈbaɪnd] *v (pt, pp* **rebound)** yeni cild çəkmək *(kitaba)*

**rebirth** [ˈri:ˈbə:θ] *n* yenidən törəmə/canlanma/dirçəlmə/bərpa; dirilmə

**reborn** [ˈri:ˈbɔ:n] *n* yenidən törəmiş/doğulmuş/dirçəlmiş/canlanmış; *The hope was reborn Ümid yenidən canlandı*

**rebound[1]** [rɪˈbaund] *n* 1. təpmə, qaytarma, rikoşet, səkdirmə *(güllənin və s.-nin dəyib yana sıçraması, sapması)*; **to hit on the ~** rikoşetlə vurmaq/vurub sapdırmaq; 2. *məc.* reaksiya *(maddələr arasında kimyəvi münasibət)*; 3. ümidi kəsilmə/boşa çıxma, məyus olma; ümidsizlik; əli soyuma, həvəsdən düşmə; 4. depressiya *(ruh düşkünlüyü, ruhi sarsıntı)*; **to take/to catch *smb.* at/on the ~** bir kəsin zəifliyindən istifadə etmək; **to marry *smb.* on the ~** ümidsizlikdən sonra *(başqasına olan məhəbbətdən)* evlənmək; 5. fikir, münasibət; əks-səda

**rebound[2]** [rɪˈbaund] *v* 1. sıçramaq, geri sıçramaq /atılmaq/tullanmaq; səkdirmək, dəyib qayıtmaq/yana sıçramaq; *The ball rebounded from/off the wall Top divara dəyib geri sıçradı/qayıtdı*; 2. əks təsir göstərmək; *The ill he did rebounded upon him Onun etdiyi pislik özünə yönəldi/dəydi*; 3. öz fikrini/münasibətini bildirmək, əks-səda yaratmaq

**rebuff[1]** [rɪˈbʌf] *n* qəti/ciddi etiraz, protest; **to meet with a ~** qəti etirazla qarşılaşmaq; **to suffer with a ~** müvəffəqiyyətsizliyə uğramaq

**rebuff[2]** [rɪˈbʌf] *v* 1. rədd etmək *(təklifi və s.)*; 2. *hərb.* dəf etmək *(hücumu)*

**rebuild** [ˌri:ˈbɪld] *v (pt, pp* **rebuilt** [ˌri:ˈbɪlt]) 1. yenidən tikmək; **to ~ a house/a town** yenidən ev/şəhər tikmək; *They rebuilt the town after the earthquake Zəlzələdən sonra onlar şəhəri yenidən tikdilər*; 2. yenidən yığmaq; **to ~ an engine** mühərriki yenidən yığmaq; 3. yenidən qurmaq; *After the divorce, he had to rebuild his life completely Arvadını boşadıqdan sonra o, həyatını tamamilə yenidən qurmalı oldu*

**rebuilt** [ˈri:ˈbɪlt] *v* **to rebuild** *felinin pt, pp formaları*

**rebuke[1]** [rɪˈbju:k] *n* danlaq, məzəmmət, tənə, qınama; narazılıq; **without ~** nöqsansız, eyibsiz, qüsursuz; **to administer a ~** danlamaq, məzəmmət etmək, qınamaq

**rebuke[2]** [rɪˈbju:k] *v* 1. danlamaq, məzəmmət etmək, suçlamaq, təqsirləndirmək, günahlandırmaq, qınamaq, tənə vurmaq, abırlamaq; ittiham etmək; 2. irad tutmaq, töhmət vermək; **to ~ *smb.* for *smth.*** bir kəsə bir şeyə görə töhmət vermək/irad tutmaq

**rebut** [rɪˈbʌt] *v* rədd/etiraz etmək, qəbul etməmək *(ittihamı, məzəmməti, danlağı və s.)*; **to ~ *smb.*'s offer** bir kəsin təklifini rədd etmək

**rebuttal** [rɪˈbʌtl] *n hüq.* təkzib, təkzib etmə /edilmə; yalana çıxartma/çıxardılma

**recall[1]** [rɪˈkɔ:l] *n* 1. geri çağırma/çağırılma *(millət vəkilini, səfiri və s.)*; 2. geri qayıtmaq üçün çağırış/siqnal *(əsgərlər və s. aid)*; **to sound the ~**

geri qayıtmaq üçün siqnal vermək; 3. *hərb.* ehtiyatda olanları hərbi xidmətə çağırma; 4. çağırma, dəvət, dəvət etmə *(ifaçını səhnəyə)*; **to give an actor a ~** aktyoru səhnəyə çağırmaq/dəvət etmək; 5. xatirə, yada salma; **past/beyond ~** yada gəlməyən/keçmiş xatirə; 6. ləğv etmə/edilmə

**recall²** [rɪ'kɔ:l] *v* **1.** geri çağırmaq *(səfiri, millət vəkilini və s.)*; *He was recalled from abroad Onu xaricdən geri çağırdılar*; **to ~ from an exile** sürgündən geri çağırmaq; **2.** *hərb.* ehtiyatdan geri çağırmaq; 3. yada salmaq, xatırlamaq; **to ~ the words of a song** mahnının sözlərini yada salmaq; *I don't recall his name Mən onun adını xatırlamıram*; 4. xatırlatmaq, yadına salmaq; *Everything here recalls my youth Burada hər şey mənim gəncliyimi yadıma salır/xatırladır*; 5. *şair.* oyatmaq; **to ~ a feeling** hiss oyatmaq; **to ~ old quarrels** köhnə mübahisələri yenidən oyatmaq/qaldırmaq; 6. geri götürmək, imtina etmək; qaçmaq; **to ~ a gift** bəxşişdən imtina etmək; **to ~ *one's* words** sözünü geri götürmək; **to ~ a promise** vəddən imtina etmək/qaçmaq; 7. ləğv etmək *(əmri, məhkəmə qərarını və s.)*

**recant** [rɪ'kænt] *v* danmaq, qaçmaq, inkar etmək, dönmək; üz döndərmək; **to ~ a promise** vədini inkar etmək, vədini geri götürmək, vəddən üz döndərmək

**recantation** [ˌri:kæn'teɪʃn] *n* üz döndərmə, əl çəkmə *(inamından və s.)*

**recap¹** ['ri:kæp] *n* = **recapitulation**

**recap²** ['ri:kæp] *v (-pp-)* = **recapitulate**

**recapitulate** [ˌri:kə'pɪtjuleɪt] *v* **1.** qısa olaraq təkrar etmək; bir-bir saymaq, sadalamaq; 2. xülasə etmək, yekun vurmaq, yekunlaşdırmaq; 3. konspekt tutmaq/yazmaq

**recapitulation** ['ri:kəˌpɪtju'leɪʃn] *n* **1.** qısaca olaraq təkrar etmə/sadalama; 2. yekunlaşdırma, xülasə, nəticə; 3. konspekt

**recapture¹** [ˌri:'kæptʃə˞] *n* **1.** geri alınma *(şəhər, qala və s. haq.)*; 2. tutma, tutulma, yaxalama, yaxalanma, ələ keçmə/ keçirilmə *(qaçağı və s.)*; 3. yaxalanmış /tutulmuş qaçaq

**recapture²** [ˌri:'kæptʃə˞] *v* **1.** geri almaq, yenidən zəbt etmək; *The town was recaptured from the enemy Şəhər düşməndən yenidən geri alındı*; 2. tutmaq; **to ~ escaped prisoners** qaçmış dustaqları tutmaq

**recast¹** [ri:'ka:st] *n* **1.** yeni forma vermə, yenidən işləmə; 2. yenidən işlənmiş və düzəliş edilmiş nəşr; 3. rolların yenidən bölünməsi

**recast²** [ri:'ka:st] *v (pt, pp* **recast**) **1.** yenidən düzəltmək, təzədən qayırmaq; yeni forma vermək; dəyişdirmək *(planı və s.)*; 2. təkrar/yenidən saymaq/ hesablamaq; 3. *tex.* yenidən tökmək *(metalı və s.)*; 4. rolları yenidən bölmək/paylamaq

**recede** [rɪ'si:d] *v* **1.** çəkilmək, geri çəkilmək; **to ~ into the background** arxa plana çəkilmək; **to ~ a few paces** bir neçə addım geri çəkilmək; 2. uzaqlaşmaq; *The ship recedes from the shore Gəmi sahildən uzaqlaşır*; 3. **(from)** imtina etmək, əl çəkmək *(sözdən, bəxşişdən və s.)*; **to ~ from an agreement** müqavilədən imtina etmək; **to ~ from an opinion** fikirdən/rəydən imtina etmək; **to ~ from a promise** vədini geri götürmək, vədinə əməl etməmək; 4. azalmaq, əskilmək, düşmək; *The high water receded Sel/Daşqın azaldı*; 5. yaddan çıxmaq, unudulmaq, xatirədən silinmək; *Memories of childhood recede Uşaqlıq xatirələri unudulur/yaddan çıxır*; 6. enmək, aşağı düşmək *(qiymət haq.)*; *Prices have receded Qiymətlər enib /aşağı düşüb*

**receipt¹** [rɪ'si:t] *n* **1.** qəbz; *Ask the shop for a receipt when you pay the bill Hesabı ödəyəndə mağazadan qəbz istə/istəyin*; 2. alma; **on ~** alanda; *We are in receipt of your letter Biz sənin/sizin məktubunu/ məktubunuzu aldıq*

**receipt²** [rɪ'si:t] *v* alarkən qəbz vermək; **to ~ a bill** hesaba imza atmaq/qol çəkmək

**receivable** [rɪ'si:vəbl] *adj* qəbul etməyə yararlı, qəbul edilə bilən, məqbul, münasib; qəbul edilməli

**receive** [rɪ'si:v] *v* **1.** almaq; **to ~ a letter/a telegram/a gift/an invitation/a warning *etc.*** məktub /teleqram/ bəxşiş/dəvətnamə / xəbərdarlıq *və s.* almaq; **to ~ *one's* salary** əmək haqqını almaq; **to ~ a mortal wound** ölümcül yara almaq; **to ~ punishment** cəza almaq; **2.** qəbul etmək *(qonağı və s.)*; **to ~ a deputation** nümayəndə heyətini qəbul etmək; *The President received the new ambassador yesterday Prezident yeni səfiri dünən qəbul etdi*; **to be cordially ~d** məmnuniyyətlə qəbul olunmaq; **to ~ *smb.* with open arms** bir kəsi qollarını açaraq qəbul etmək; **to ~ a proposal/a petition** təklif /ərizə qəbul etmək; 3. *id.* qəbul etmək, götürmək *(topu: tennis oyununda)*

**received** [rɪ'si:vd] *adj* adi, hamı tərəfindən qəbul edilmiş, hər yerdə işlənən/ olan, hamıya məlum olan, hamı tərəfindən qəbul edilən; **the ~ pronunciation** adi/hamı tərəfindən qəbul edilmiş/hər yerdə işlənən tələffüz; **the ~ opinion** hamı tərəfindən qəbul edilən rəy/fikir

**receiver** [rɪ'si:və˞] *n* **1.** alan *(şəxs)*; yük alan, adına yük/mal göndərilən adam/ şəhər/ idarə və s.; 2. radioqəbuldici aparat; 3. telefon dəstəyi; **to lift/to pick up the ~** telefon dəstəyini götürmək/ qaldırmaq; **to put down/to replace the ~** dəstəyi yerinə qoymaq; 4. seysmoqraf *(zəlzələni avtomatik surətdə qeyd edən cihaz)*

**recent** ['ri:snt] *adj* yaxın keçmişdəki, bu günlərdəki/yaxınlardakı; axırıncı, sonuncu; təzə, çağdaş, müasir; **~ events** bu günlərdəki/yaxınlardakı hadisələr; **~ news** son/sonuncu xəbərlər; **~ fashions** son/müasir dəblər; **~ development** son nailiyyət



**recently** ['ri:sntlɪ] *adv* yaxınlarda, bu günlərdə, bir az bundan qabaq, son zamanlar; *She hasn't been feeling well recently O, son zamanlar özünü yaxşı hiss etmir; They are recently married Onlar yaxınlarda/bu günlərdə evləniblər*

**receptacle** [rɪ'septəkl] *n* **1.** anbar; ...saxlanılan yer; qəbul məntəqəsi; rezervuar, çən *(maye və qaz saxlamaq üçün)*; 2. qutu, kisə, yeşik, qab *(mal qablamaq üçün)*

**reception¹** [rɪ'sepʃn] *n* **1.** qəbul, qəbul etmə; **a warm ~** isti/hərarətli qəbul; **to give *smb.* a kind/a cold ~** bir kəsi mehribanlıqla/soyuq qəbul etmək; **~ of deposits** əmanətlərin qəbulu; **2. (into)** üzvlüyə qəbul etmə; **~ into the Academy** Akademiyanın üzvlüyünə qəbul etmə; **a state ~** təntənəli qəbul; **the ~ of a new ambassador by the President** Prezidentin yeni səfiri qəbul etməsi; **to hold a ~** qəbul təşkil etmək; 3. qavrayış, qavrama, dərk etmə; **faculty of ~** qavrama/dərk etmə qabiliyyəti; 4. *rad.* qəbul, qəbul olunma; *Reception of the BBC World Service is poor here BBC-nin dünya verilişi burada pis tutulur (yəni pis eşidilir)*

**reception²** [rɪ'sepʃn] *adj* qəbul; qəbul edən; **a ~ camp** qəbul düşərgəsi; **a ~ centre** qəbul mərkəzi; **a ~ test** qəbul testi

**receptionist** [rɪ'sepʃənɪst] *n* **1.** müştərilərin /görüşə gələnlərin qəbulu ilə məşğul olan katib; 2. qeydçi *(xəstəxanada və s.)*

**reception-room** [rɪ'sepʃnrum] *n* qəbul otağı; qonaq otağı; ümumi otaq, yaşayış otağı

**receptive** [rɪ'septɪv] *adj* zəkalı, qabil, istedadlı, fərasətli, tez qavrayan, zehinli; həssas; **~ of beauty** gözəlliyə həssas, gözəlliyi həssaslıqla qavrayan

**receptivity** [rɪsep'tɪvɪtɪ] *n* qabiliyyət, istedad, fərasət; qavrama/dərk etmə qabiliyyəti

**recess¹** [rɪ'ses, 'ri:ses] *n* **1.** fasilə *(iclasda, işdə, parlamentdə və s.)*; parlamentdə kanikul *(həm də* **parlamentary ~**); **to take a ~ 1)** fasilə elan etmək *(iclasda)*; **2)** parlament kanikuluna getmək; **to be in ~** fasilədə olmaq, iclas aparmamaq; *The conference is in recess Konfrans indi fasilədədir*; 2. *amer.* tətil, tətil vaxtı/zamanı *(məktəbdə, universitetdə)*; 3. *amer.* məktəbdə tənəffüs; **noon/little ~** böyük/ kiçik tənəffüs

**recess²** [rɪ'ses, 'ri:ses] *v* **1.** geri çəkmək; **to ~ a hedge from the line of the road** hasarı yol xəttindən geri çəkmək; 2. gizli yerdə/xəlvətdə gizlətmək; 3. *amer.* tənəffüs etmək *(işdə, iclasda)*; 4. *amer.* kanikula getmək; 5. təxirə salmaq; *The hearing was recessed İşə baxılma təxirə salındı*

**recession** [rɪ'seʃn] *n* **(from) 1.** uzaqlaşma, getmə, çıxma; kənara çıxma, geri çəkilmə; 2. imtina /rədd etmə, boyun qaçırma; **~ from a contract** *hüq.* müqavilədən imtina etmə/boyun qaçırma; 3. çıxma *(təşkilatdan və s.)*; 4. çəkilmə; **the ~ of the sea from the coast-line** dənizin sahil xəttindən çəkilməsi; 5. *iqt.* enmə, azalma, tənəzzül; **economic ~** iqtisadi tənəzzül; **~ in demand** tələbin azalması; **to be in ~** tənəzzül içərisində olmaq; *The whole country is in recession Bütün ölkə tənəzzüldədir/tənəzzül içərisindədir*

**recharge** [ˌri:'tʃa:dʒ] *v* yenidən doldurmaq; *Please recharge your glasses and drink to the bride and groom! Zəhmət olmasa, badənizi/badələrinizi doldur/doldurun və gəlinlə bəyin sağlığına iç/için!*;

◊ **to ~ *one's* batteries** dincəlib qüvvə toplamaq/özünə gəlmək

**rechristen** ['ri:'krɪsn] *v* **1.** ikinci dəfə xaç suyuna çəkmək; 2. yeni/təzə ad vermək

**recidivism** [rɪ'sɪdɪvɪzm] *n* residivizm, cinayətkarlıq

**recidivist** [rɪ'sɪdɪvɪst] *n hüq.* residivist *(dəfələrlə cinayət edən adam)*

**recipe** ['resɪpɪ] *n* **1.** resept *(xüs. aşpazlıq haq.)*; 2. üsul, yol, qayda; **a ~ for happiness/for success** xoşbəxtliyin/ müvəffəqiyyətin yolu, xoşbəxt olmanın/müvəffəqiyyət qazanmanın üsulu

**recipe-book** ['resɪpɪbuk] *n* aşpazlıq kitabı

**recipient¹** [rɪ'sɪpɪənt] *n* alan; qəbul edən; **~s of awards** mükafat alanlar

**recipient²** [rɪ'sɪpɪənt] *adj* **1.** alan, kömək alan; **~ countries** kömək alan ölkələr; 2. həssas; zəkalı, fərasətli; zehinli, tez qavrayan

**reciprocal** [rɪ'sɪprəkl] *adj* **1.** qarşılıqlı, ikitərəfli; **a ~ relationship between teachers and students** müəllimlər və tələbələr arasında qarşılıqlı əlaqə; **~ affection** qarşılıqlı məhəbbət; **~ concessions** qarşılıqlı güzəştlər; **~ reaction** *kim.* qarşılıqlı/ikitərəfli reaksiya; **a treaty providing for ~ privileges** qarşılıqlı imtiyazlar nəzərdə tutan müqavilə; 2. *qram.* qarşılıq bildirən *(əvəzlik haq.)*; **~ pronouns** qarşılıq bildirən əvəzliklər

**reciprocally** [rɪ'sɪprəkəlɪ] *adv* qarşılıqlı olaraq/surətdə, ikitərəfli olaraq

**reciprocate** [rɪ'sɪprəkeɪt] *v* **1.** qarşılıqlı olaraq cavab vermək; **to ~ *smb.'s* feeling** bir kəsin hissinə qarşılıqlı olaraq cavab vermək; bir kəsin hissinə şərik olmaq; **to ~ dislike** qarşılıqlı nifrət bəsləmək; **to ~ hostility** düşmənçiliyə düşmənçiliklə cavab vermək; **to ~ hatred** bir-birinə nifrət bəsləmək; 2. cavab vermək; **to ~ every attack** hər bir hücuma cavab vermək; *He reciprocated every attack with a blow Hər bir hücuma o, zərbə ilə cavab verdi*; 3. mübadilə etmək; **to ~ good wishes** bir-birinə xoş arzularını bildirmək

**reciprocity** [ˌresɪ'prɔsɪtɪ] *n* **1.** qarşılıqlılıq, ikitərəflilik; qarşılıqlı olma; **on the basis /footing of ~** qarşılıqlılıq əsasında; 2. qarşılıqlı təsir/əlaqə, bir-birinə təsir etmə

**recital** [rɪ'saɪtl] *n* **1.** ifadə/şərh etmə, anlatma; ifa-

də, şərh, izah; təfərrüatı ilə/ətraflı sadalama; ~ **of facts** məsələnin durumunu ətraflı şərh etmə; **2.** danışma, nağıl/hekayə/rəvayət etmə; rəvayət, nağıl, hekayə, təsvir, təsvir etmə; **the ~ of** ***one's*** **adventures** öz macəraları haqqında ətraflı danışma; **3.** bir icraçının konserti, solo konsert; bir bəstəçinin əsərindən ibarət konsert

**recitation** [ˌresɪˈteɪʃn] *n* **1.** deklamasiya *(bədii oxu sənəti)*; **2.** ucadan təkrar etmə; **3.** ifadə/şərh etmə; sadalama *(faktları və s.)*; **4.** nağıl, hekayə, nağıl etmə; ~ **of** ***one's*** **woes** öz bədbəxtliyi haqqında ətraflı nağıl/hekayə

**recite** [rɪˈsaɪt] *v* **1.** deklamasiya demək, ifadəli oxumaq, təmtəraqla söyləmək *(bədii əsəri)*; **2.** danışmaq, nağıl etmək; **3.** sadalamaq *(faktları və s.)*; **to ~** ***one's*** **grievances** öz inciklikləirini sadalamaq

**reckless** [ˈreklɪs] *adj* ağılsız, düşüncəsiz, mühakiməsiz, tədbirsiz, ehtiyatsız; qayğısız, səhlənkar, laqeyd; ~ **step** ehtiyatsız addım; ~ **decision** ağılsız/ mühakiməsiz qərar; **to cause death by ~ driving** ehtiyatsız maşın sürməklə ölümə səbəb olmaq

**recklessly** [ˈreklɪslɪ] *adv* ağılsızcasına, düşünmədən, ehtiyatsızlıqla, səhlənkarcasına, qayğısız bir surətdə/tərzdə

**recklessness** [ˈreklɪsnɪs] *n* ağılsızlıq, düşüncəsizlik, mühakiməsizlik, ehtiyatsızlıq, laqeydlik, səhlənkarlıq

**reckon** [ˈrekən] *v* **1.** saymaq; **to learn to read, to write and to ~** oxumağı, yazmağı və saymağı öyrənmək; **to ~ from ten** ondan başlayıb saymaq; **to ~ to sixty** altmışa qədər saymaq; **2.** hesab etmək; **to ~** ***smb.*** **wise/prosperous** bir kəsi ağıllı/dövlətli hesab etmək; **to ~** ***smb.*** **as an enemy** bir kəsi düşmən hesab etmək; **3.** fikirləşmək, zənn/güman/hesab etmək, sanmaq; **to ~ that** ***smth.*** **will happen** bir şeyin baş verəcəyini zənn/ güman etmək; *I reckon the explosion was ten miles away Mən zənn edirəm ki, partlayış 10 mil uzaqda oldu; I reckon (that) it is going to rain Zənn edirəm ki, yağış yağacaq;* **4. (on, upon)** ümid olmaq, güvənmək, bel bağlamaq, etibar etmək; *I am not reckoning on /upon him Mən ona bel bağlamıram/etibar etmirəm;* **5. (with)** nəzərə almaq, hesablaşmaq; *He is a doughty opponent and one to be reckoned with O, güclü düşməndir/ rəqibdir və onunla hesablaşmaq lazımdır;* **6. (with)** haqq-hesab çəkib üzülüşmək, haqq-hesabı üzmək; *I'll reckon with him at the end of the year Mən ilin axırında onunla haqq-hesabı üzəcəm*

**reckoning** [ˈrekənɪŋ] *n* **1.** hesab, hesablama, hesablanma; **to be good at ~** saymağı yaxşı bilmək; **by my ~ 1)** mənim hesablamama görə; **2)** məncə, mənə görə; mənim fikrimcə; **to make no ~ of** ***smth.*** bir şeyi hesaba almamaq; **2.** hesab *(xüs. mehmanxana üçün)*; **to pay the ~** hesabı ödəmək;

◊ **a day of ~** *din.* haqq-hesab günü, məhşər /qiyamət günü; **to be out in/out of** ***one's*** **~** hesablamada yanılmaq/səhv etmək

**reclaim** [rɪˈkleɪm] *v* **1.** islah/təshih etmək; yaxşılaşdırmaq; çəkindirmək; **to ~ a criminal/a drunkard** cinayətkarı/əyyaşı islah etmək; **to ~** ***smb.*** **from vice/from sin** bir kəsi əxlaqsızlıqdan/günah etməkdən çəkindirmək; **to ~** ***smb.*** **to a sense of duty** bir kəsdə vəzifə hissi oyatmaq; **2.** düzəltmək, islah etmək *(səhvi)*; **to ~ an error** səhvi düzəltmək; **3.** *k.t.* şumlamaq, sürmək *(xam torpağı)*; **4.** geri tələb etmək; **to ~ lost property** itmiş əmlakı geri tələb etmək

**reclaimed** [rɪˈkleɪmd] *adj* islah olunmuş, tövbə etmiş *(günahkar və s. haq.)*; **a ~ woman** tövbə etmiş qadın; **a ~ drunkard** tövbə etmiş əyyaş

**reclaiming** [rɪˈkleɪmɪŋ] *n* **1.** bərpa, bərpa etmə/edilmə, əvvəlki halına salma/ salınma; yenidən təsis etmə/edilmə; **2.** *k.t.* əkmə *(xam torpağı)*

**reclamation** [ˌrekləˈmeɪʃn] *n* **1.** düzəltmə, düzəldilmə, təmir etmə; islah etmə; düzəliş, təshih; yaxşılaşma, yaxşılaşdırma, təkmilləşdirmə; **2.** *k.t.* istifadə etmə *(torpaq haq.)*; meliorasiya *(qurutma, suvarma və s. yolu ilə torpağın münbitliyini artırma)*; **3.** qəti etiraz; **4. (for)** geri qaytarmaq haqqında tələb *(bir şeyi)*

**recline** [rɪˈklaɪn] *v* **1.** söykənmək; bədənini geri çəkmək; dirsəklənmək; **to ~ on a couch** divana dirsəklənmək; **to ~ at ease** sərələnmək, sərilmək *(divanda və s.)*; *They lay reclined upon the grass Onlar göy otun üstündə sərələndilər;* **to ~ against** ***smth.*** bir şeyə söykənmək; **2. (on, upon)** qoymaq, söykəmək, geri çəkmək; **to ~** ***one's*** **head on the pillow** başını balışın üstünə qoymaq; **3. (on, upon)** ümid olmaq, güvənmək, bel bağlamaq, inanmaq, etibar etmək; **4.** geri əymək *(oturacağı və s.)*

**recluse** [rɪˈklu:s] *n* rahib, zahid, guşənişin; **to live/to lead the life of a ~** zahid/rahib həyatı keçirmək

**reclusion** [rɪˈklu:ʒn] *n* rahiblik, zahidlik, tərkidünyalıq, guşənişinlik

**recognition** [ˌrekəgˈnɪʃn] *n* **1.** tanıma; tanınma; *My recognition of him was immediate Mən onu dərhal tanıdım;* **2.** başa düşmə, dərk etmə; **~ of danger** təhlükəni başa düşmə/dərk etmə; **3.** etiraf, etiraf etmə, bəyənmə; **to win/to receive ~ from the public** ictimaiyyət tərəfindən bəyənilmək, ictimaiyyətin etirafını qazanmaq; **4.** *hüq.* rəsmi olaraq etiraf etmə *(faktı, iddianı və s.)*, təsdiq, təsdiq etmə; **~ of a child as a lawful heir** uşağın qanuni varis olduğunun etiraf edilməsi; **~ of a woman as a lawful wife** qadının qanuni arvad olduğunu etiraf etmə/təsdiqləmə; **5.** salamlaşma *(qarşılaşarkən)*; *He only gave me a passing recognition O keçib gedərkən mənimlə ancaq salamlaşdı; She gave me a smile of recognition O məni təbəssümlə salamladı;* **6.**



söz vermə; **~ of a speaker by the chair** çıxış etmək istəyənə sədrin söz verməsi;

◊ **beyond/out of (all) ~** tanınmaz dərəcədə; *The town has changed beyond all recognition Şəhər tanınmaz dərəcədə dəyişib*

**recognize, -ise** [rekəgnaɪz] *v* **1.** tanımaq, bilmək; **to ~ an old friend** köhnə dostu tanımaq; *Dogs recognize people by their smell İtlər adamları onların iyindən tanıyırlar;* **2.** bilmək, başa düşmək, dərk etmək, görmək; **to ~ the omens of defeat** məğlubiyyətin əlamətlərini dərk etmək/görmək; **to ~ danger** təhlükəni anlamaq /dərk etmək; **to ~** ***one's*** **duty/** ***one's*** **position** öz vəzifəsini/vəziyyətini dərk etmək; **3.** qiymətləndirmək; **to ~ services/loyalty** xidmətləri/etibarı qiymətləndirmək; *His talent was at last recognized Onun istedadı nəhayət qiymətləndirildi;* **4.** etiraf etmək; boynuna almaq; **to ~ defeat** məğlubiyyəti etiraf etmək; **to refuse to ~** ***one's*** **signature** imzasını etiraf etməkdən boyun qaçırmaq; **to ~ a natural child** kəbinsiz uşağı boynuna almaq; *He knows he's wrong, but won't recognize it O bilir ki, səhv edir, lakin bunu boynuna almır/etiraf etmir;* **5.** *hüq.* rəsmi olaraq tanımaq; **to ~ a new country/a government** yeni ölkəni/dövləti tanımaq *(rəsmi olaraq)*; **6.** salamlamaq *(görüşərkən)*; **to ~** ***smb.*** **in the street** bir kəslə küçədə salamlaşmaq; **7.** söz vermək *(parlamentin iclasında)*; *I recognize mister A. Söz cənab A-ya verilir; Mr Chairman, may I be recognized? Cənab sədr, xahiş edirəm mənə söz verin!*

**recoil**[1] [rɪˈkɔɪl] *n* **1.** geri atılma/sıçrama; **2.** təpmə *(silah atılarkən)*

**recoil**[2] [rɪˈkɔɪl] *v* **1.** geri sıçramaq/atılmaq /tullanmaq; *She recoiled at the sight of the snake O, ilanı görəndə geri sıçradı/atıldı;* **2.** təpmək *(silah haq.)*

**recoilless** [rɪˈkɔɪllɪs] *adj hərb.* təpməyən *(silah haq.)*; **~ gun** təpməyən top

**recollect** [ˌrekəˈlekt] *v* yada salmaq, xatırlamaq; **to ~ the days of** ***one's*** **childhood** uşaqlıq illərini yada salmaq/ xatırlamaq; *Do you recollect her name? Onun adını xatırlayırsanmı?/ xatırlayırsınızmı?*

**recollection** [ˌrekəˈlekʃn] *n* **1.** yaddaş, hafizə, huş; xatirə; *It's out of my recollection Bunu mən xatırlamıram, Bu mənim huşumdan çıxıb;* **to bring** ***smth.*** **to** ***one's*** **~** bir şeyi yada salmaq/ xatırlamaq; **2.** *pl* xatirələr; **~s of youth/of childhood** gənclik/uşaqlıq xatirələri; *He's writing his recollections O, xatirələrini yazır*

**recommence** [ˌri:kəˈmens] *v* yenidən başlanmaq, başlamaq; *The meeting will recommence at two İclas saat ikidə yenidən başlanacaq*

**recommend** [ˌrekəˈmend] *v* **1.** məsləhət görmək, tövsiyə etmək; **to ~ a book to read** oxumaq üçün kitab məsləhət görmək/ tövsiyə etmək; **to ~ a doctor/a tailor, etc.** həkim/dərzi *və s.* məsləhət görmək; *Can you recommend me a good doctor? Sən/Siz mənə yaxşı bir həkim məsləhət görərsənmi?/görərsinizmi?; I recommend you to have a rest Mən sənə/sizə məsləhət görürəm ki, dincələsən/dincələsiniz;* **2.** təqdim etmək, yaxşı rəy vermək, irəli çəkmək *(vəzifəyə)*; **to ~ a candidate for a post** vəzifəyə namizəd təqdim etmək/ göstərmək; **3.** inanmaq, tapşırmaq, həvalə etmək; himayəsinə vermək; *I recommend him to your care Mən onu sənin/sizin himayənə/himayənizə verirəm*

**recommendation** [ˌrekəmenˈdeɪʃn] *n* **1.** məsləhət, məsləhət vermə; tövsiyə, tövsiyə etmə; **on/upon the ~ of** ***smb.*** bir kəsin zəmanəti/tövsiyəsi ilə; **to make ~s** məsləhət vermək, tövsiyə etmək; **the ~s of the commission** komissiyanın məsləhətləri/tövsiyələri; **2.** zəmanət; **to give** ***smb.*** **a (letters of) ~** bir kəsə zəmanət vermək

**recompense**[1] [ˈrekəmpens] *n* **1.** kompensasiya, əvəz, qarşılıq; **sum granted as a ~** kompensasiya üçün müəyyən edilmiş məbləğ *(məhkəmə tərəfindən)*; **2.** cəza; **~ for** ***one's*** **sins** günahları üçün cəza, günahlarına görə cəza

**recompense**[2] [ˈrekəmpens] *v* **1.** kompensasiya/əvəz vermək, ödəmək; **to be ~d for losses/for damages** itkilər/ dəymiş zərərlər üçün kompensasiya almaq; **2.** mükafatlandırmaq, mükafat vermək; **to ~ a person for his services** xidmətlərinə görə bir kəsi mükafatlandırmaq; **3.** cəzalandırmaq; **to ~** ***smb.*** **for his misdeeds** bir kəsi cinayətinə görə cəzalandırmaq

**reconcile** [ˈrekənsaɪl] *v* **1.** barışdırmaq; **to ~** ***smb.*** **to/with** ***smth.*** bir kəsi bir şeylə barışdırmaq; **2.** düzəltmək, yoluna qoymaq, qaydaya salmaq, həll etmək; **to ~ quarrels/disagreements** mübahisələri/ narazılıqları yoluna qoymaq

**reconciliation** [ˌrekənsɪlɪˈeɪʃn] *n* **1.** barışıq, barışma, barışdırma; **2.** düzəltmə, yoluna qoyma, qaydaya/qaydasına salma, həll etmə *(mübahisəni)*; **3.** uyğunluq, müvafiqlik, uzlaşma; **the absence of ~ between the theory and practice of life** nəzəriyyə ilə həyat təcrübəsi arasında uyğunsuzluq; **the ~ of opinions** fikirlərin/rəylərin uyğunluğu/müvafiqliyi

**recondite** [ˈrekəndaɪt] *adj* **1.** aydın olmayan, anlaşılmayan, anlaşılmaz *(fənn, fikir və s. haq.)*; **2.** anlaşılmaz/çətin anlaşılan dildə yazan *(yazıçı haq.)*

**recondition** [ˌri:kənˈdɪʃn] *v (xüs. maşınlar haq.)* təmir etmək, qaydaya/nizama salmaq

**reconditioned** [ˌri:kənˈdɪʃnd] *adj* təmir olunmuş /edilmiş; **~ engine** təmir edilmiş /olunmuş mühərrik; *It's not a new typewriter – it's been reconditioned Bu, təzə makina deyil, o, təmir olunub*

**reconnaissance**[1] [rɪˈkɔnɪsns] *n* **1.** *hərb.* kəşfiyyat, axtarış; **aerial ~** *av.* hava kəşfiyyatı; **2.** tədqiqat; **map ~** xəritə üzrə tədqiqat aparma; **lunar ~** ay səthinin tədqiqi; **3.** qabaqcadan əvvəlcə-

dən öyrənmə, yoxlama, yoxlanma; **to make a ~ before opening negotiations** danışıqları başlamadan vəziyyəti öyrənmək

**reconnaissance²** [rɪ'kɔnɪsns] *adj* kəşfiyyatçı, kəşfiyyat; **a ~ satellite** kəşfiyyatçı peyk; **a ~ aircraft** kəşfiyyatçı təyyarə; **a ~ agency** *hərb.* kəşfiyyat orqanı/idarəsi; **a ~ party** *hərb.* kəşfiyyatçı qrup

**reconnoitre** [ˌrekə'nɔɪtəʳ] *v* kəşfiyyat aparmaq; *The platoon was sent to reconnoitre the village before the attack Hücumdan əvvəl kəndə kəşfiyyat aparmaq üçün dəstə göndərildi*

**reconsider** [ˌri:kən'sɪdəʳ] *v* yenidən baxmaq, təkrar gözdən keçirmək, təkrar yoxlamaq; yenidən müzakirə etmək; dəyişmək *(qərarı və s.)*; **to ~ *one's* decision/position** öz qərarını/mövqeyini dəyişmək

**reconsideration** [ˌri:kənˌsɪdə'reɪʃn] *n* 1. yenidən baxma/baxılma, təkrar gözdən keçirmə/keçirilmə; 2. yenidən müzakirə etmə/edilmə

**reconstitute** [ˌri:'kɔnstɪtju:t] *v* 1. quruluşunu dəyişdirmək; **to ~ a committee** komitənin quruluşunu dəyişdirmək; 2. qurudulmuş ərzağı əvvəlki vəziyyətə qaytarmaq *(su və s. qatmaqla)*; **to ~ dried milk** qurudulmuş südü suda həll etmək

**reconstitution** [ˌri:ˌkɔnstɪ'tju:ʃn] *n* yenidən yaratma/yaradılma, yenidən hasil etmə, canlandırma, canlandırılma

**reconstruct** [ˌri:kən'strʌkt] *v* 1. yenidən/başqa cür tikmək *(bina haq.)*; yenidən/başqa cür qurmaq; yenidən təşkil etmək; 2. bərpa etmək, əvvəlki halına salmaq; **to ~ a mammoth from few bones** bir neçə sümükdən mamontun skeletini bərpa etmək; **to ~ a crime** cinayətin mənzərəsini yenidən yaratmaq

**reconstruction** [ˌri:kən'strʌkʃn] *n* 1. yenidən qurma/qurulma, yenidən təşkil etmə/edilmə; **educational ~** xalq təhsilini yenidən qurma; 2. bərpa etmə/edilmə, əvvəlki halına salma/salınma; **the postwar ~ of Germany** Almaniyanın müharibədən sonra bərpa edilməsi/bərpası

**record¹** ['rekɔ:d] *n* 1. yazma, qeyd, qeyd etmə/edilmə; **to make a ~ of *smth.*** bir şeyi qeyd etmə/qeydə alma; **to keep a ~ of a conversation** söhbəti qeydə almaq/ yazmaq; *I can find no record of it Bu heç yerdə qeyd edilməyib*; 2. qeyd, qeyd etmə/edilmə, yazma; qeyd aparma; **~s of births/marriages/deaths** doğum/evlənmə/ölüm haqqında qeyd aparma; 3. protokol *(iclasın və s.)*; **to enter on the ~** protokola daxil etmək/salmaq; 4. faktlar, sübutlar *(bir kəs haqqında)*, səciyyə; ad, şöhrət; **to have a good ~** yaxşı ada/ şöhrətə malik olmaq; 5. *id.* rekord; **world ~** dünya rekordu; **to beat/to break ~** rekordu təzələmək; **to achieve a ~** rekord qazanmaq, rekord müəyyən etmək; 6. səsyazma, fonoqram; 7. qrammofon valı; 8. abidə *(tarixi)*; **the ~s of the past** keçmişin abidələri

**record²** ['rekɔ:d] *adj* I 1. qeydiyyat; qeyd; **a ~ department/room** *tib.* qeydiyyat/qeyd otağı; 2. sənədli; **a ~ film** sənədli film

**record** ['rekɔ:d] *adj* II rekord, ən yüksək/artıq/böyük; görünməmiş; **~ pace /height/output** ən yüksək sürət/ hündürlük/məhsuldarlıq; **~ crop** rekord məhsul; **~ prices** ən yüksək qiymətlər; **a ~ drought** görünməmiş quraqlıq

**record³** [rɪ'kɔ:d] *v* 1. yazmaq, qeyd etmək; protokol yazmaq; siyahıya daxil etmək/ almaq; **to ~ a speech** nitqi yazmaq, nitqin stenoqrafiyasını yazmaq; **to ~ the day's events** günün hadisələrini qeyd etmək; **to ~ *one's* thoughts in a diary** fikirlərini gündəliyə yazmaq/qeyd etmək; 2. qeydə almaq, göstərmək *(cihaz haq.)*; *A seismograph records earthquakes Seysmoqraf zəlzələləri qeydə alır; The thermometer recorded 40° C Termometr 40° C göstərdi*; 3. vala/plyonkaya yazmaq; *The gramophone has recorded his voice Onun səsi qrammofon valına yazılıb*; 4. əbədiləşdirmək; *This stone records a famous battle Bu daş məşhur döyüşü əbədiləşdirir*

**recorder** [rɪ'kɔ:dəʳ] *n* 1. özüyazan və ya özüqeyd edən cihaz; **altitude ~** baroqraf *(hava təzyiqini avtomatik yazan aparat)*; 2. səsyazan aparat, maqnitofon; 3. protokolçu, protokol yazan; qeydçi *(idarəyə daxil olan və idarədən çıxan sənədləri dəfələrlə qeyd edən qulluqçu)*; registrator *(avtomatik yazan cihaz)*; 4. arxivçi, arxivarius; 5. qədim fleyta növü

**recount** [rɪ'kaunt] *v* ətraflı şəkildə danışmaq/nağıl etmək; təfərrüatı ilə söyləmək/danışmaq; **to ~ *one's* adventures to a friend** öz macəralarını dosta təfərrüatı ilə danışmaq

**re-count¹** ['ri:'kaunt] *n* sayma, bir-bir sayma, təkrar sayma/sayılma, yenidən hesablama *(xüs. seçkidə)*; *The unsuccessful candidate demanded a re-count of the votes Seçkidə uduzmuş namizəd səslərin yenidən sayılmasını tələb etdi*

**re-count²** [ˌri:'kaunt] *v* yenidən/təkrarən saymaq, yenidən/təkrarən hesablamaq *(xüs. seçkidə)*

**recoup** [rɪ'ku:p] *v* 1. kompensasiya/əvəz vermək, ödəmək; **to ~ *smb.* for loss** itki üçün bir kəsə kompensasiya vermək; 2. tutmaq, çıxmaq *(verilən puldan)*

**recoupment** [rɪ'ku:pmənt] *n hüq.* kompensasiya; əvəzi verilmə, əvəzini vermə; əvəz

**recourse** [rɪ'kɔ:s] *n* kömək üçün müraciət; **to have ~** kömək üçün müraciət etmək; kömək almaq

**recover** [rɪ'kʌvəʳ] *v* 1. geri almaq, özünə qaytarmaq *(mübarizə/müharibə yolu ilə)*; **to ~ a stolen property/a lost umbrella** oğurlanmış əmlakı/itmiş çətiri geri almaq; **to ~ a country /territory** ölkəni /ərazini geri almaq *(düşməndən)*; **to ~ the lost ground** itirilmiş mövqeyi özünə qaytarmaq; **to ~ a lost throne** taxt-tacı özünə/geri qaytarmaq; 2. yenidən əldə etmək/nail olmaq; **to ~ *smb.'s* affection** bir kəsin məhəbbətinə yenidən



nail olmaq; **to ~ *one's* courage** yenidən cəsarət əldə etmək; **to ~ *one's* self-possession** özünü yenidən ələ almaq; *He recovered his voice/his appetite Onun səsi/iştahası yenidən özünə qayıtdı/açıldı*; **to ~ *one's* balance** müvazinətini bərpa etmək /düzəltmək; **to ~ *one's* liberty** azadlığını bərpa etmək; 3. sağalmaq *(xəstəlikdən)*; *The patient is recovering Xəstə sağalır*; 4. **(from)** özünə gəlmək; **to ~ from a defeat/from a disaster** məğlubiyyətdən/fəlakətdən sonra özünə gəlmək; *He could not recover from astonishment O, təəccübdən özünə gələ bilmirdi*; 5. canlanmaq, sabit qalmaq; *Prices have recovered Qiymətlər sabitləşib; Business is recovering Ticarət canlanır*; 6. yerini doldurmaq; əvəzini vermək/çıxmaq/ödəmək; **to ~ the lost time** itirilmiş vaxtın əvəzini çıxmaq; 7. yığmaq, toplamaq; **to ~ debts** borcları yığmaq/toplamaq

**re-cover** [ˌri:'kʌvəʳ] *v* yeni üz çəkmək; **to ~ a cushion with velvet** divana velvetdən (yeni) üz çəkmək

**recoverable** [rɪ'kʌvərəbl] *adj* 1. əvəzi verilə/ödənilə bilən; **~ losses** əvəzi ödənilə bilən itkilər; 2. müalicə oluna bilən, sağala bilən, müalicəsi mümkün olan

**recovery** [rɪ'kʌvərɪ] *n* 1. qaytarma, qaytarılma; geri qaytarma; **~ of stolen property** oğurlanmış əmlakı/malı geri qaytarma; 2. sağalma, yaxşılaşma; **to make a quick/good/slow ~ from illness** xəstəlikdən tez/yaxşı/gec sağalmaq; *The patient is making a good recovery Xəstə tez sağalır*; 3. yaxşılaşdırma, yaxşılaşma, canlandırma, canlanma, bərpa etmə/ edilmə; **economic ~** iqtisadi canlanma; **trade/industrial ~** ticarətdə/ sənayedə canlanma; 4. ödəmə, ödənilmə, əvəzini vermə; **~ of damages** ziyanı ödəmə; 5. təmir, bərpa etmə; 6. əvvəlki vəziyyətə qaytarma; düzəlmə, düzəltmə; **to make a ~ from a fall** yıxılmaqdan özünü saxlamaq

**recreate** ['rekrɪeɪt] *v* 1. gücü/qüvvəni bərpa etmək; təzələmək, təravətləndirmək, canlandırmaq, yeniləşdirmək, yeniləşmək; təmir/bərpa etmək; **to ~ oneself** dincəlmək, gücü bərpa etmək, təravətlənmək; 2. əyləndirmək; **to ~ oneself** əylənmək, fikrini dağıtmaq

**recreation¹** [ˌrekrɪ'eɪʃn] *n* istirahət, əyləncə, gücünü bərpa etmə; **a few moments of ~** bir neçə dəqiqəlik istirahət; **to walk for ~** istirahət məqsədi ilə gəzməyə/ gəzintiyə çıxmaq; *Gardening is a recreation Bağçılıqla məşğul olmaq istirahətdir/əyləncədir; Among his recreation are chess and gardening Şahmat və bağçılıq onun əyləncələridir*

**recreation²** [ˌrekrɪ'eɪʃn] *adj* istirahət; **a ~ room** *amer.* istirahət otağı; **~ facilities** istirahət yerləri *(klub, teatr, stansiya, restoran və s.)*

**recreational** [ˌrekrɪ'eɪʃənl] *adj* əyləncə; **~ facilities** əyləncə yerləri

**recriminate** [rɪ'krɪmɪneɪt] *v* bir-birini ittiham etmək, bir-birinə irad tutmaq; ittihama cavab vermək

**recrimination** [rɪˌkrɪmɪ'neɪʃn] *n* qarşılıqlı ittiham /təqsirləndirmə; qarşılıqlı məzəmmət/tənə; **to engage in ~** bir-birin məzəmmət etmək, bir-birinə tənə vurmaq

**recriminatory** [rɪ'krɪmɪnətərɪ] *adj* qarışılıqlı, müqabil; **~ remarks** qarşılıqlı iradlar

**recruit¹** [rɪ'kru:t] *n* 1. yeni əsgər *(əsgərliyə yeni gəlmiş şəxs)*, çağırışçı; 2. yeni üzv *(təşkilatın, cəmiyyətin və s.)*; **to make many ~s for a party** partiyaya yeni üzvlər cəlb etmək; 3. təzə işçi/şagird

**recruit²** [rɪ'kru:t] *v* 1. cəlb etmək, təşkilata üzv toplamaq; 2. doldurmaq, artırmaq; **to ~ *one's* numbers** öz miqdarını artırmaq; 3. möhkəmləndirmək, bərkitmək; gücləndirmək; **to go to the country to ~** möhkəmlənmək üçün kəndə getmək

**recruiter** [rɪ'kru:təʳ] *n* yığan, toplayan *(fəhlə və s.)*

**recruitment** [rɪ'kru:tmənt] *n* 1. *hərb.* yığma, cəlb etmə; şəxsi heyəti komplektləşdirmə; 2. sağlamlığı bərpa etmə, sağalma, yaxşılaşma

**rectangle** ['rekˌtæŋgl] *n riyaz.* düzbucaqlı dördbucaq

**rectangular** [rek'tæŋgjuləʳ] *adj* dördbucaqlı

**rectangularity** [rek'tæŋgjulərɪtɪ] *n* dördbucaqlılıq, dördbucaqlı forma/olma

**rectification** [ˌrektɪfɪ'keɪʃn] *n* 1. düzəltmə, düzəldilmə, təmir, təmir etmə; düzəliş/ islah etmə; **~ of errors** səhvlərin düzəlişi /islah edilməsi; 2. *el.* düzləndirmə *(cərəyan haq.)*; 3. *kim.* təmizləmə; rektifikasiya *(ikinci dəfə distillə etmə yolu ilə maye qatışığının tərkib hissələrinə ayrılması prosesi)*

**rectify** ['rektɪfaɪ] *v (pt, pp* **-fied***)* 1. düzəltmək, təshih etmək; qayırmaq; təmir etmək; **to ~ an error** səhvi düzəltmək/təshih etmək; 2. yoluna qoymaq, qaydaya/sahmana salmaq; 3. sazlamaq, kökləmək *(musiqi alətini və s.)*; 4. *kim.* təmizləmək; 5. *el.* düzləndirmək *(cərəyanı)*

**rectilinear** [ˌrektɪ'lɪnɪəʳ] *adj* düzxətli, düz xətlə gedən

**rectitude** ['rektɪtju:d] *n* 1. düzlük, təmizlik, doğruluq, namus, vicdan, sədaqət; əxlaq, əxlaq qaydaları; 2. doğruluq, düzlük, haqlılıq

**rector** ['rektəʳ] *n* 1. rektor; 2. pastor *(protestant keşişi)*

**rectorate** ['rektərɪt] *n* 1. rektorluq, rektor vəzifəsi; 2. rektorat

**rectorial** [rek'tɔ:rɪəl] *adj* rektor; **~ elections** rektor seçkisi

**rectress** ['rektrɪs] *n* qadın rektor

**recuperate** [rɪ'kju:pəreɪt] *v* 1. sağalmaq, yaxşı olmaq, düzəlmək *(xəstəlikdən və s. sonra)*; 2. düzəltmək; bərpa etmək, əvvəlki vəziyyətinə salmaq/qaytarmaq *(sağlamlığı və s.)*; 3. sağaltmaq; **to ~ *smb.*** bir kəsi sağaltmaq

**recuperation** [rɪ.kju:pə'reɪʃn] *n* sağalma, sağalma dövrü; **to have great powers of ~** böyük sağalma gücünə malik olmaq

**recuperative** [rɪ'kju:pərətɪv] *adj* müalicəvi, şəfaverici, cana xeyirli; **the ~ effects of sea air** dəniz havasının müalicəvi/ şəfaverici təsiri

**recur** [rɪ'kə:ʳ] *v* (-rr-) 1. qayıtmaq; **to ~ to the former subject** əvvəlki müzakirə mövzusuna qayıtmaq; **to ~ to past experience** keçmiş təcrübəyə əsaslanmaq; 2. (**to**) yenidən ağıla gəlmək *(fikir haq.)*; **to ~ to the memory** yaddaşa qayıtmaq; 3. təkrar olunmaq; **a problem which ~s periodically** vaxtaşırı qalxan/ qarşıya çıxan problem; *Steps have been taken so that the accident can never recur Belə bədbəxt hadisənin bir daha təkrar olunmaması üçün tədbirlər görülüb*

**recurrence** [rɪ'kʌrəns] *n* təkrar, təkrar olunma, qayıtma; **to prevent the ~ of** *smth*. bir şeyin təkrar olunmasının qarşısını almaq; **the ~ of an illness/error/ problem** xəstəliyin/səhvin/problemin təkrar olunması

**recurrent** [rɪ'kʌrənt] *adj* təkrar, vaxtaşırı/hərdənbir təkrar olunan; **~ dislocation** *tib.* təkrar olunan çıxıq; **~ attacks/ headaches** vaxtaşırı təkrar olunan hücumlar/başağrıları; **a ~ problem/theme** təkrar olunan problem/mövzu

**red**[1] [red] *n* 1. qırmızı rəng; **light ~** açıq-qırmızı; **dark ~** tünd-qırmızı; *She was dressed in red O, qırmızı geyinmişdi; There is too much red in the painting Boyada qırmızı rəng həddindən artıq çoxdur*; 2. *siya*. qırmızı, inqilabçı; **the Reds** Qırmızılar, kommunistlər; 3. **the Reds** *amer*. qırmızıdərililər *(Şimali və Cənubi Amerika hinduları)*

**red**[2] [red] *adj* 1. qırmızı, al-qırmızı; **a ~ pencil /ball/apple** qırmızı karandaş/şar/ alma; **~ leaves /flowers** qırmızı/al-qırmızı yarpaqlar/çiçəklər; **a ~ rose** qırmızı/al-qırmızı qızılgül; 2. al; **~ cheeks** al yanaqlar; 3. qızarmış; **~ with anger** acıqdan/qəzəbdən qızarmış; **eyes ~ with weeping** ağlamaqdan qızarmış gözlər; **to go/to turn/to become ~** qızarmaq, qırmızı olmaq;
◊ **to see ~** ağlını itirmək, dəli kimi olmaq; **~ meat** mal əti

**Red Crescent**[1] ['red'kresent] *n* Qırmızı Aypara

**Red Crescent**[2] ['red'kresent] *adj* Qırmızı Aypara; **~ Society** Qırmızı Aypara Cəmiyyəti

**Red Cross**[1] ['red'krɔs] *n* Qırmızı Xaç

**Red Cross**[2] ['red'krɔs] *adj* Qırmızı Xaç; **~ Society** Qırmızı Xaç Cəmiyyəti; **~ hospital** Qırmızı Xaç Cəmiyyətinin xəstəxanası

**redcurrant** [.red'kʌrənt] *n bot.* qırmızı qarağat

**redden** ['redn] *v* 1. qızartmaq; *The smoke made her eyes redden Tüstü onun gözlərini qızartdı*; **to ~ *one's* lips with lipstick** pomada ilə dodaqlarını qızartmaq; 2. qızarmaq; **to ~ with shame** xəcalətdən/utancaqlıqdan qızarmaq; *The girl stared at him and he reddened Qız gözlərini ona zillədi və o qızardı*

**reddish** ['redɪʃ] *adj* qırmızımtıl, qırmızıya çalan; **~ hair** qırmızımtıl saç

**redecorate** [.ri:'dekəreɪt] *v* yenidən bəzəmək *(xüs. otağı: yeni rəng və ya divar kağızı çəkmək)*

**redeem** [rɪ'di:m] *v* 1. pul verib azad etmək/qurtarmaq; girovu geri almaq, girovluqdan qurtarmaq; **to ~ a prisoner/a slave** əsiri/qulu pul verib azad etmək; **to ~ pledged goods** girov qoyulmuş malları pul verib geri almaq; 2. özünə qaytarmaq, geri almaq/qaytarmaq; **to ~ a captured city** zəbt edilmiş şəhəri geri qaytarmaq/ almaq; 3. bərpa etmək; **to ~ a ruined country** dağıdılmış ölkəni bərpa etmək; **to ~ *one's* position/*one's* rights** öz vəziyyətini/hüquqlarını bərpa etmək; 4. yerinə yetirmək; **to ~ a promise** vədini yerinə yetirmək; 5. düzəltmək; yumaq; **to ~ an error** səhvi düzəltmək; *His good points redeem his faults Onun müsbət cəhətləri günahlarını yuyur*

**redeemable** [rɪ'di:məbl] *adj* 1. alına/ ödənilə bilən *(istiqraz və s.)*; 2. islah oluna/düzəldilə bilən *(səhv haq.)*

**redemption** [rɪ'dempʃn] *n* 1. pul verib qurtarma/azad etmə, girovu geri alma; azad etmə üçün pul; ödəmə, ödənmə; 2. geri alma/qaytarma; 3. yerinə yetirmə *(vədi və s.)*; 4. islah etmə; **the ~ of a criminal** cinayətkarı islah etmə; 5. xilas/ azad etmə; 6. yuma *(günahı)*

**redemptive** [rɪ'demptɪv] *adj* 1. günahı yüngülləşdirən/yuyan; 2. islahedici, düzəldici; **the ~ power of love** məhəbbətin islahedici gücü

**redeploy** [.ri:dɪ'plɔɪ] *v hərb.* dislokasiyanı/ yerini dəyişdirmək, başqa yerdə yerləşdirmək/yerləşmək; **to ~ troops elsewhere** ordunu/qoşunu başqa yerdə yerləşdirmək

**redeployment** ['ri:dɪ'plɔɪmənt] *n* 1. *hərb.* yenidən qruplaşma/qruplaşdırma, dislokasiyanı dəyişmə/dəyişdirmə, başqa yerdə yerləşdirmə; 2. yenidən təşkil etmə /qurma *(istehsalatı)*

**red-eye** ['redaɪ] *n zool.* qızıl üzgəc *(balıq növü)*

**red-haired** ['redheəd] *adj* kürən, kürənsaç

**redirect** [.ri:də'rekt] *v* adresini/ünvanını dəyişmək, başqa adresə/ünvana göndərmək *(məktubu)*

**redistribute** ['ri:dɪs'trɪbju:t] *v* yenidən paylamaq/paylaşdırmaq/bölmək/ bölüşdürmək; **to ~ jobs/a land/a power** işləri/torpağı/qüvvəni yenidən bölüşdürmək / bölmək

**redistribution** [.ri:dɪst'rɪbju:ʃn] *n* yenidən bölmə/bölüşdürmə, yenidən paylama/ paylaşdırma; **the ~ of wealth/labour/ resources** var-dövləti/əməyi/ehtiyatları yenidən bölüşdürmə

**redness** ['rednɪs] *n* qırmızılıq; qızartı, qırmızı ləkə

**redo** [.ri:'du:] *v (pt* **redid** [-dɪd]; *pp* **redone** [-dʌn]) 1. yenidən etmək/qayırmaq; dəyişdirmək; 2. təmir etmək

**redolence** ['redələns] *n* xoş iy/ətir, rayihə

**redolent** ['redələnt] *adj* 1. xoş, bihuşedici, sərxoşedici *(iy haq.)*; **the ~ scent of pines** şam ağaclarının sərxoşedici iyi/rayihəsi; 2. ətirli; **~ wine** ətirli şərab



**redone** ['ri:'dʌn] **to redo** *felinin pp forması*

**redouble** [.ri:'dʌbl] *v* 1. gücləndirmək, gücünü artırmaq, qüvvətləndirmək, artırmaq; dərinləşdirmək; **to ~ *one's* efforts** səylərini artırmaq; 2. artmaq, qüvvətlənmək, güclənmək; *The clamour redoubled İnilti daha da gücləndi*; 3. iki qatlamaq/qatlanmaq

**redoubt** [rɪ'daut] *n* 1. *hərb. tar.* redut *(keçmiş vaxtlarda kiçik istehkam)*; 2. *məc.* dayaq, içqala, bürc; istinadgah

**redoubtable** [rɪ'dautəbl] *adj* qəzəbli, qeyzli, qorxunc; **a ~ opponent** qəzəbli/ qeyzli rəqib

**redound** [rɪ'daund] *v* 1. kömək/yardım etmək, yol vermək, səbəb olmaq; **to ~ to *smb.'s* advantage** bir kəsin xeyrinə olmaq; 2. (**upon**) göstərmək, təsir göstərmək/etmək; *These crimes will redound upon their authors Bu cinayətlər onları törədənlərə qarşı çevriləcək*

**reduce** [rɪ'dju:s] *v* 1. aşağı salmaq, endirmək; azaltmaq, əskiltmək; qısaltmaq; **to ~ expenditure** xərci azaltmaq; **to ~ production** istehsalı azaltmaq/aşağı salmaq; **to ~ staff** ştatı azaltmaq; **to ~ taxes** vergiləri aşağı salmaq/azaltmaq; **to ~ prices** qiymətləri aşağı endirmək /salmaq; **to ~ speed** sürəti aşağı salmaq/azaltmaq; 2. zəiflətmək, yüngülləşdirmək; **to ~ pain** ağrını yüngülləşdirmək; **to ~ *one's* sight /*one's* hearing** görməsini/eşitməsini zəiflətmək; 3. arıqlamaq; *Exercise reduces stout people Gəzinti/İdman kök adamları arıqladır*; **to be greatly ~d by illness** xəstəlikdən bərk arıqlamaq; 4. döndərmək; **to ~ to powder** toza döndərmək; **to ~ to ashes** (yandırıb) külə döndərmək; 5. çevirmək; **to ~ dollar to cents** dolları sentə çevirmək; **to ~ a common fraction to a decimal** adi kəsiri onluq kəsirə çevirmək; **to ~ bribery to a system** rüşvəti sistemə çevirmək; 6. məcbur/vadar etmək; **to ~ to silence** susmağa məcbur/vadar etmək; **to ~ to submission** itaətə/tabe olmağa/boyun əyməyə məcbur etmək; 7. qalib gəlmək, zəbt/fəth/istila etmək, almaq; özünə tabe etmək; *After a long siege they reduced the fort Uzun mühasirədən sonra onlar qalanı fəth/zəbt etdilər/aldılar*; 8. gödəltmək; **to ~ the length of a coat** paltonun uzunluğunu gödəltmək

**reduced** [rɪ'dju:st] *adj* 1. azaldılmış, endirilmiş, aşağı salınmış; **a ~ scale** azaldılmış miqyas /ölçü; **a ~ pressure** aşağı salınmış təzyiq; **~ prices** endirilmiş /aşağı salınmış qiymətlər; 2. arıqlamış, zəifləmiş; 3. *fon*. reduksiya edilmiş

**reduction** [rɪ'dʌkʃn] *n* 1. aşağı salma/ salınma, düşmə, endirmə, endirilmə, enmə; azalma, azaldılma; ixtisar etmə/ edilmə, ixtisara salma/ salınma; **~ of armaments** silahların ixtisar edilməsi; **~ of wages/of speed/of temperature** əmək haqqının/sürətin/ temperaturun aşağı salınması; **~ of demand** tələbin azalması; **~ of prices** qiymətlərin aşağı salınması/ düşməsi; 2. (**to, into**) çevirmə, döndərmə; **~ to powder** toza döndərmə; 3. fəth/zəbt/ istila etmə; zorla alma *(şəhəri, qalanı və s.)*

**redundancy** [rɪ'dʌndənsɪ] *n* 1. hədsizlik, artıqlıq, son dərəcə böyüklük; **speech full of rebundancies** həddindən artıq təkrarlar olan nitq; 2. fəhlə qüvvəsinin artıqlığı; *The factory closure will result in 200 redundancies Zavodun bağlanması 200 fəhlənin işsiz qalması ilə nəticələnəcək, Zavodun bağlanması nəticəsində 200 fəhlə işsiz qalacaq*

**redundant** [rɪ'dʌndənt] *adj* 1. artıq; lazımsız, gərəksiz; **~ population in the cities** şəhərlərdə əhalinin artıqlığı; **to become ~** artıq/lazımsız /gərəksiz olmaq; 2. bol, çox; təmtəraqlı, dəbdəbəli, calallı, möhtəşəm; **~ food** dəbdəbəli/bol süfrə; **~ skirts** dəbdəbəli yubkalar; 3. uzun, uzun-uzadı *(üslub haq.)*; 4. artıq *(fəhlə qüvvəsi haq.)*; 5. ixtisara düşmüş, işdən çıxarılmış; **to become ~** işsiz olmaq

**reduplicate**[1] [rɪ'dju:plɪkɪt] *adj* ikiqat artırılmış/çoxaldılmış

**reduplicate**[2] [rɪ'dju:plɪkeɪt] *v* ikiqat artırmaq /çoxaltmaq; təkrar etmək

**reduplication** [rɪ.dju:plɪ'keɪʃn] *n* 1. ikiqat artırma/çoxaltma; 2. *dilç*. təkrar

**redwood** ['redwud] *n bot*. qırmızı ağac

**reed** [ri:d] *n* 1. *bot*. qamış, qarğı; 2. *top.i* qamışlıq, qarğılıq; 3. *mus*. qamış dilçək *(nəfəsli alətlərdə)*

**reedy** ['ri:dɪ] *adj* 1. qamışlı, qamış bitmiş; **a ~ river bank** qamışlı çay sahili; 2. nazik, zil *(səs haq.)*

**reef**[1] [ri:f] *n* I *dən*. rif *(sualtı qayalar)*

**reef** [ri:f] *n* II *dən*. rif *(gəmi yelkənində: ip keçirilən halqa/ilmək)*

**reef**[2] [ri:f] *v dən*. rifləmək *(rif vasitəsilə gəmi yelkənlərini yığışdırmaq)*

**reefing-jacket** ['ri:fɪŋ'dʒækɪt] *n* buşlat *(matros pencəyi)*

**reek**[1] [ri:k] *n* üfunət, çox pis iy/qoxu; **the ~ of stake tobacco** kiflənmiş tütün iyi

**reek**[2] [ri:k] *v* 1. tüstüləmək, yüngül tüstü buraxmaq *(baca, yanğın qalığı və s. haq.)*; tüstülətmək; 2. pis iy vermək/iylənmək; iy gəlmək; **to ~ of garlic/of sweat/of alcohol** sarımsaq /tər /spirt iylənmək; ***His clothes reek*** *tobacco Onun paltarından tütün iyi gəlir*; 3. *məc*. iy gəlmək; *It reeks of flattery Bundan yaltaqlıq iyi gəlir*

**reeky** ['ri:kɪ] *adj* 1. tüstüləyən, tüstü/buxar buraxan; 2. tüstülü, tüstü dolmuş; 3. hisə verilmiş, hisləndirilmiş; hisdə qurudulmuş

**reel**[1] [ri:l] *n* I 1. tağalaq, qarqara, makara; 2. rulon *(lülə şəklində bükülmüş kağız, müşəmbə və s.)*

**reel** [ri:l] *n* II oynaq şotland xalq rəqsi

**reel**[2] [ri:l] *v* I 1. qarqaraya/makaraya/ tağalağa sa-

rımaq/dolamaq *(həm də* **to ~ in/up**); **2**. açmaq *(yumağı və s.)*

**reel** [ri:l] *v* II **1**. fırlanmaq, valaylanmaq, hərlənmək; *My head reeled Mənim başım fırlandı/hərləndi*; **2**. tərpənmək, yellənmək, yırğalanmaq; *The tower reeled under the shook Qüllə təkandan tərpəndi/yırğalandı; The ship reeled under the force of the waves Gəmi dalğaların gücündən yırğalandı*; **3**. səndələmək, valaylamaq, valay vurmaq; **to ~ to and fro like a drunken man** sərxoş/kefli adam kimi irəli-geri səndələmək/valaylamaq; **4**. geri çəkilmək *(həm də* **to ~ back/backward**); **to make the enemy ~ back** düşməni geri çəkilməyə məcbur/vadar etmək

**re-elect** [ˌri:ɪˈlekt] *v* yenidən/təzədən seçmək; *He was not re-elected Onu yenidən seçmədilər, O yenidən seçilmədi*

**re-election** [ˈri:ɪˈlekʃn] *n* yenidən seçmə/seçilmə, təkrar seçmə/seçilmə

**re-enter** [ˈri:ˈentəʳ] *v* **1**. yenidən girmək/daxil olmaq; **2**. geri dönmək/qayıtmaq; **to ~ the game** *id*. oyuna qayıtmaq, yenidən oyuna girmək

**re-entry** [rɪˈentrɪ] *n* yenidən qayıtma/geri dönmə *(bir yerə və s.)*; **to be refused ~ without a visa** vizasız geri qayıtmağa icazə verməmək/verilməmək

**re-establish** [ˈri:ɪsˈtæblɪʃ] *v* **1**. bərpa etmək; əvvəlki halına salmaq/qaytarmaq; **to ~ a firm's credit** firmanın kreditini geri qaytarmaq; **to ~ *smb.* in his possessions** bir kəsin mülkünü qaytarmaq; **2**. düzəltmək, qaydasına salmaq; **to ~ *one's* affairs** işlərini qaydaya salmaq; **3**. başqa yerə köçürmək; **to ~ the flooded town on a new site** sel/su basmış şəhəri başqa yerə köçürmək; **to ~ refugees in new homes** qaçqınları yeni ərazidə yerləşdirmək

**re-establishment** [ˈri:ɪsˈtæblɪʃmənt] *n* yenidən bərpa etmə/edilmə, əvvəlki halına salma; yenidən təsis etmə/edilmə

**re-examination** [ˈri:ɪgˌzæmɪˈneɪʃn] *n* **1**. yenidən yoxlama; **2**. təkrar imtahan; **3**. *hüq*. şahidi yenidən dindirmə

**re-examine** [ˈri:ɪgˈzæmɪn] *v* **1**. yenidən yoxlamaq; **2**. yenidən imtahan etmək/ aparmaq; **3**. *hüq*. yenidən baxmaq *(işə)*; **4**. şahidi yenidən dindirmək

**refer** [rɪˈfə:ʳ] *v* (**-rr-**) **1**. göndərmək, yollamaq; ünvanlamaq; **to ~ a patient to a specialist** xəstəni mütəxəssisin yanına göndərmək; *I referred him to the secretary Mən onu katibin yanına göndərdim/yolladım*; **to ~ *smb.* to the Inquiry Office** bir kəsi məlumat bürosuna göndərmək; *If they come, I'll refer them to you Əgər gəlsələr, mən onları sənin/sizin yanına/yanınıza göndərəcəm*; **2**. müraciət etmək *(kömək və s. üçün)*; *I'll have to refer to the Board Mən idarəyə müraciət etməli olacam*; **3**. məlumat almaq; baxmaq; **to ~ to a map/to a dictionary** məlumat üçün xəritəyə/lüğətə müraciət etmək; *He referred to his watch for the exact time Dəqiq vaxtı bilmək üçün o, saatına baxdı*; **4**. **(to)** aid etmək *(sinfə, dövrə və s.)*; *The discovery of gunpowder is usually referred to China Barıtın kəşfi adətən, Çinə aid edilir; Minute organisms which some refer to animals, others to plants Bəzi mikroorqanizmlər heyvanlara, digərləri isə bitkilərə aid olur*; **5**. əsaslanmaq *(bir kəsə/şeyə)*; **to ~ to *smth.* for proof** sübut olaraq bir şeyə əsaslanmaq; *For my proof I refer to the document quoted Sübut üçün mən göstərilmiş sənədlərə əsaslanıram*; **6**. aid edilmək, aidiyyəti/münasibəti olmaq; *The regulation refers only to children Bu qayda ancaq uşaqlara aiddir, Bu qaydanın ancaq uşaqlara aidiyyəti var*

**referee**[1] [ˌrefəˈri:] *n* **1**. *hüq*. arbitr; münsiflər məhkəməsi; hakim, münsif *(idman yarışlarında)*; **2**. *id*. hakim, referi; **chief ~** baş hakim; **~'s ball** mübahisəli top *(futbolda)*

**referee**[2] [ˌrefəˈri:] *v id*. hakimlik etmək; *Who refereed the match? Yarışa kim hakimlik etdi?*

**reference**[1] [ˈrefərəns] *n* **1**. əsaslanma, sitat gətirmə, istinad etmə; yada salma; xatırlatma; **to make ~ to *smb./smth*.** bir kəsə/şeyə əsaslanmaq; **to ~ to a previous conversation** olmuş söhbətə əsaslanmaq; *No further reference to him was made Onu bir daha xatırlamadılar, Bir daha onun adı çəkilmədi*; **with/in ~** əsaslanaraq; **with ~ to your reply** sənin/sizin cavabına/ cavabınıza əsaslanaraq...; **2**. haşiyə *(səhifənin aşağısında, xətt altında yazılan qeyd/izahat)*; **3**. sitat, mənbə; *The writer gives no references to his authorities Müəllif mənbələr haqqında heç bir qeyd vermir*; **4**. soraq, arayış, məlumat; **a book of ~** soraq kitabı; **to make ~ to the guidebook/to a catalogue/to a dictionary** soraq kitabçasından/ kataloqdan/lüğətdən məlumat almaq; **5**. zəmanət, tövsiyə, yaxşı rəy; zəmanət/tövsiyə vermə; **to engage a servant without ~s** xidmətçini zəmanətsiz işə götürmək; **to have good ~s** yaxşı zəmanəti olmaq; **6**. zəmanət/rəy verən şəxs; *Who are your references? Sənə/Sizə zəmanət verənlər kimlərdir?*; **7**. səlahiyyət; **to keep to/within the (terms of) ~** səlahiyyətdən kənara çıxmamaq; *It's outside the reference of the commission Bu, komissiyanın səlahiyyəti xaricindədir/səlahiyyətinə daxil deyil*; **8**. əlaqə, bağlılıq; münasibət; **~ of a fact to its cause** sübutun/ dəlilin/faktın onun səbəbilə əlaqəsi; *These facts bear/have no reference to the matter under discussion Bu faktların müzakirə olunan məsələyə dəxli yoxdur/məsələ ilə əlaqəsi yoxdur*; **without ~ to** asılı olmayaraq, nəzərə almadan

**reference**[2] [ˈrefərəns] *adj* arayış, məlumat; **a ~ book** arayış/məlumat kitabı; *This dictionary is



a useful reference book Bu lüğət yaxşı arayış/məlumat kitabıdır (yəni bu lüğətdə yaxşı məlumatlar var)*; **~ library** ancaq kitabxanada oxumaq üçün kitab verən kitabxana; **~ marks** məlumat/arayış işarələri; **, §, / are reference marks *, §, / məlumat/arayış işarələridir*

**referenda** [ˌrefəˈrendə] *n* **referendum** *isminin cəm forması*

**referendum** [ˌrefəˈrendəm] *n (pl* **referendums** *və ya* **referenda**) referendum *(çox mühüm dövlət məsələsini həll etmək üçün səsə qoyma, xalqın rəyini öyrənmə)*; **to hold a ~ on a matter** hər hansı bir məsələ üzrə referendum keçirmək

**refill**[1] [ˌri:ˈfɪl] *n* **1**. əlavə etmə, tamam; dolma, doldurma; tökmə; **~ of fuel** yanacaqla doldurma, yanacaq tökmə; **2**. ehtiyat batareya; preslənmiş kirşan/pudra

**refill**[2] [ˌri:ˈfɪl] *v* **1**. yenidən doldurmaq; *I refilled his glass Mən onun badəsini/ qədəhini yenidən doldurdum*; **to ~ a pipe** qəlyanı yenidən doldurmaq; *We refilled at the next station Biz növbəti yanacaq məntəqəsində yanacaq doldurduq*

**refine** [rɪˈfaɪn] *v* **1**. təmizləmək; saflaşdırmaq; **to ~ oil 1)** yağı saflaşdırmaq; **2)** nefti təmizləmək; **2**. təmizləşmək, saflaşmaq; **3**. təkmilləşdirmək, yaxşılaşdırmaq; **to ~ a language** dili təmizləmək/ yaxşılaşdırmaq; **4**. **(on, upon)** təfərrüata varmaq, incələmək; **to ~ upon a question** məsələnin təfərrüatına varmaq, məsələni incələmək/ətraflı müzakirə etmək

**refined** [rɪˈfaɪnd] *adj* **1**. təmizlənmiş, saflaşdırılmış; **~ oil** təmizlənmiş neft; **~ salt** təmizlənmiş/saflaşdırılmış duz; **2**. zərif, incə, gözəl, qəşəng; nəcib, alicənab; əsilzadə; **~ manners** zərif/incə davranışlar; **a ~ way of speaking** incə/gözəl danışıq tərzi; **~ ladies** əsilzadə xanımlar

**refinement** [rɪˈfaɪnmənt] *n* **1**. incəlik, zəriflik; nəfislik, gözəllik, qəşənglik; **~ of taste** zövqün gözəlliyi/incəliyi/ zərifliyi; **2**. təfərrüat; **to go into ~s** təfərrüata varmaq; **3**. təkmilləşdirilmə, yaxşılaşdırma

**refinery** [rɪˈfaɪnərɪ] *n* **1**. nefttəmizləyən zavod; **2**. saflaşdırma/saflaşdırıcı zavod

**refit**[1] [ˌri:ˈfɪt] *n* **1**. təmir, təmir etmə; söküb quraşdırma, təzədən quraşdırma *(mexanizmi və s.)*; **2**. yenidən təchiz etmə/edilmə *(gəmi və s. haq.)*; *The hotel has undergone a complete refit Mehmanxana tamamilə yenidən təchiz edilib*; **3**. *hərb*. yenidən silahlanma/ silahlandırma

**refit**[2] [ˌri:ˈfɪt] *v* (**-tt-**) **1**. təmizləmək, təmir etmək; **2**. yenidən təchiz etmək *(gəmini və s.)*; **to ~ a ship/a kitchen/ a factory, *etc*.** gəmini/mətbəxi/zavodu və s. yenidən təchiz etmək; **3**. yenidən silahlandırmaq

**reflate** [ˌri:ˈfleɪt] *v mal. ölkədə istifadə olunan pulun miqdarını artırmaq, süni olaraq pul kütləsini artırmaq*

**reflation** [rɪˈfleɪʃn] *n mal*. yeni/süni inflyasiya

**reflect** [rɪˈflekt] *v (əsasən məchulda işlənir)* **1**. əks etdirmək/etmək, göstərmək; **to ~ light** işığı əks etdirmək/etmək; *A mirror reflects light Güzgü işığı əks etdirir/edir; His face reflected his emotions Sifəti onun hisslərini əks etdirdi; The literature of a people reflects its manners Xalqın ədəbiyyatı onun adətini əks etdirir*; **2**. **(on, upon)** fikirləşmək, götür-qoy etmək, düşünmək; **to ~ upon a problem** problem üzərində düşünmək, problemi götür-qoy etmək; *Reflect upon what I have said to you Sənə/Sizə dediyim haqqında fikirləş/fikirləşin*; **to ~ on/upon 1)** kölgə salmaq, şübhə doğurmaq; **to ~ upon *smb.*'s sincerity** bir kəsin düzlüyü/ namusluluğu haqqında şübhə yaratmaq; **to ~ upon *smb.*'s honour** bir kəsin şöhrətinə/şərəfinə kölgə salmaq; **2)** ziyan etmək, zərər vurmaq/vermək; *His rudeness reflects upon himself Onun kobudluğu/qabalığı özünə ziyan edir/ zərər vurur*

**reflected** [rɪˈflektɪd] *adj* əks olunmuş; **~ light** əks olunmuş işıq

**reflection** [rɪˈflekʃn] *n* **1**. əks/dəf etmə/olma; qaytarma; inikas; **the ~ of light/of heat/of sound** işığın/istiliyin/ səsin əks olunması; **the angle of ~** əks etmə/olunma bucağı; **2**. əks, şəkil; **the ~ of the Moon in the water** ayın suda əksi; **3**. düşünmə, fikirləşmə, götür-qoy etmə; **to do *smth.* without sufficient ~** bir şeyi yaxşı fikirləşmədən/götür-qoy etmədən etmək; *On reflection you will change your mind Götür-qoy etdikdən sonra sən/siz fikrini/fikrinizi dəyişəcəksən/dəyişəcəksiniz*; **4**. məzəmmət, töhmət, danlaq, tənə; **to cast a ~ upon *smb***. bir kəsə tənə vurmaq, bir kəsi danlamaq/ məzəmmət etmək; **5**. ləkə, kölgə; *This is a reflection on his honour Bu onun şərəfi/şöhrəti üçün ləkədir*

**reflective** [rɪˈflektɪv] *adj* **1**. qaytaran, əks etdirən; **2**. düşüncəli, fikirləşən; **~ mind** düşüncəli zəka /ağıl; **~ reading** düşüncəli oxu; **3**. fikirli, dalğın; **~ face** fikirli/dalğın sifət

**reflectively** [rɪˈflektɪvlɪ] *adv* fikirli, dalğın, fikirli-fikirli, dalğın bir surətdə/tərzdə; *He was sitting puffing reflectively on his pipe O fikirli-fikirli oturub qəlyana qullab vururdu*

**reflector** [rɪˈflektəʳ] *n* **1**. *fiz*. reflektor *(şüaları əks etdirən cihaz)*; **2**. *astr*. çökük aynalı teleskop

**reflex**[1] [ˈri:fleks] *n* **1**. əks, surət; **the moon's ~ in the water** ayın suda əksi; **2**. refleks *(canlı orqanizmin xarici təsirə qarşı reaksiyası)*; **3**. nəticə, yekun

**reflex**[2] [rɪˈfleks] *adj* reflektiv; qeyri-ixtiyari, qeyri-şüuri, qeyri-iradi; **~ action** qeyri-ixtiyari/qeyri-iradi hərəkət; **a ~ response** qeyri-iradi/qeyri-ixtiyari cavab

**reflexion** [rɪˈflekʃn] *n* = **reflection**

**reflexive**[1] [rɪˈfleksɪv] *n qram*. qayıdış əvəzliyi, qayıdış fel

**reflexive**[2] [rɪ'fleksɪv] *adj qram.* qayıdış; ~ **pronouns** qayıdış əvəzlikləri
**refloat** [ˌri:'flout] *v* yenidən üzmək *(gəmi və s. haq.)*
**reform**[1] [rɪ'fɔ:m] *n* 1. reforma; islahat; **sweeping ~s** əsaslı islahatlar; **to carry out ~s on education** təhsildə islahatlar aparmaq; **economic ~s** iqtisadi islahatlar; 2. düzəltmə, yaxşılaşdırma, yaxşılaşma
**reform**[2] [rɪ'fɔ:m] *v* 1. yaxşılaşdırmaq, islahat aparmaq, islah etmək; kökündən dəyişdirmək, başqa şəklə salmaq; **to ~ the electorial system** seçki sistemini yaxşılaşdırmaq/kökündən dəyişdirmək; **to ~ administration** idarəni kökündən dəyişdirmək; 2. islah etmək, düzəltmək, tərbiyə etmək; **to ~ one's habits** adətlərini islah etmək; **to ~ juvenile offenders** azyaşlı cinayətkarları tərbiyə etmək
**reformation** [ˌrefə'meɪʃn] *n* 1. dəyişmə, dəyişdirmə, şəklini/formasını dəyişmə, kökündən dəyişmə; islahat; **the ~ of learning** təhsil sistemində/təhsildə islahat; 2. tərbiyə etmə
**reformatory** [rɪ'fɔ:mətrɪ] *n* islahedici müəssisə *(xüs. azyaşlı cinayətkarlar üçün)*
**reformer** [rɪ'fɔ:mə$^r$] *n* islahatçı, reformator
**reformist** [rɪ'fɔ:mɪst] *n* reformist, reformizm tərəfdarı
**refract** [rɪ'frækt] *v fiz.* sındırmaq *(şüanı)*; *Light is refracted when passed through prism Prizmadan keçəndə şüa sınır*
**refraction** [rɪ'frækʃn] *n fiz.* sınma; **angle of ~** sınma bucağı; *A stick held in the water will appear to bend, showing refraction (of light) Suya salınmış çubuq əyilmiş görünəcək; bu, işığın sınmasını göstərir*
**refractory** [rɪ'fræktərɪ] *adj* 1. tərs, inad, inadcıl, inadkar, kəc; dikbaş, itaətsiz, boyun əyməyən; 2. *tib.* çətin müalicə olunan; 3. küt, qabiliyyətsiz, naqabil, korazehin
**refrain**[1] [rɪ'freɪn] *n* nəqarət; *I'll sing the verses and you'll all join in for the refrain Mən şerləri oxuyacam və siz hamınız nəqarata qoşulacaqsınız*
**refrain**[2] [rɪ'freɪn] *v* özünü/nəfsini saxlamaq; çəkinmək; imtina etmək; **to ~ from doing** ***smth.*** bir şeyi etməkdən imtina etmək/çəkinmək; *She couldn't refrain from smiling O özünü gülümsəməkdən saxlaya bilmədi*
**refresh** [rɪ'freʃ] *v* 1. təravətləndirmək, təravətlənmək; möhkəmlənmək, möhkəmləndirmək *(həm də* **to ~ oneself**); **to ~ oneself with a cup of tea** bir fincan çayla özünü təravətləndirmək; *The long sleep refreshed her Uzun müddət yatmaq onu təravətləndirdi; The rest will refresh you Dincəlmək sənin/sizin gücünü/gücünüzü möhkəmləndirəcək*; 2. soyutmaq, sərinlətmək; 3. ehtiyat götürmək; **to ~ a ship with water** gəmiyə su ehtiyatı götürmək
**refreshing** [rɪ'freʃɪŋ] *adj* təravətləndirici; həyatverici, canlandırıcı; ~ **sleep** təravətləndirici yuxu; ~ **breeze** canlandırıcı meh/külək; ~ **drink** təravətləndirici içki
**refreshment** [rɪ'freʃmənt] *n* 1. qüvvəni/ gücü bərpa etmə; istirahət; **to feel ~ of mind and body** ruhən və cismən dinclik hiss etmək; 2. təravətləndirici şey, yemə, içmə, yeyib-içmə; **to take/to have some ~** yeyib-içmək, qarnını bərkitmək; 3. *pl* yüngül yemək, səhər yeməyi; *Light refreshments will be served during the break Tənəffüs vaxtı/zamanı yüngül yemək veriləcək*
**refrigerate** [rɪ'frɪdʒəreɪt] *v* 1. soyutmaq; dondurmaq; soyumaq; donmaq; 2. soyuq yerdə saxlamaq
**refrigerated** [rɪ'frɪdʒəreɪtɪd] *adj* soyudulmuş; dondurulmuş; ~ **meat** dondurulmuş ət; **to keep meat/fish ~** əti/balığı dondurulmuş halda saxlamaq
**refrigeration** [rɪˌfrɪdʒə'reɪʃn] *n* soyutma; dondurma
**refrigerator** [rɪ'frɪdʒəreɪtə$^r$] *n* soyuducu; soyuducu cihaz/qurğu
**refuel** ['ri:fjuəl] *v* yanacaq ehtiyatını artırmaq, yanacaq götürmək
**refuge** ['refju:dʒ] *n* 1. sığınacaq *(yer)*, daldalanacaq *(yer)*; **to seek ~** sığınacaq /daldalanacaq axtarmaq; **to take ~** sığınacaq/daldalanacaq tapmaq; 2. əl atmaq; **to take ~ in lying** yalana əl atmaq
**refugee** [ˌrefju'dʒi:] *n* qaçqın; qaçaq; mühacir; **war ~s** müharibə qaçqınları; **political ~s** siyasi mühacirlər
**refund**[1] ['ri:fʌnd] *n* ödəmə *(ziyanı)*; ödənmə, ödəniş; vermə *(borcu)*
**refund**[2] [rɪ'fʌnd] *v* əvəzini vermək, ödəmək *(ziyanı)*; vermək *(borcu)*
**refusal** [rɪ'fju:zl] *n* rədd etmə/edilmə; boyun qaçırma, imtina etmə; rədd, rədd cavabı; **the ~ of a request/an invitation /an offer** xahişi/dəvəti/təklifi rədd etmə
**refuse**[1] ['refju:s] *n* 1. tullantı, zibil; **kitchen ~** mətbəx tullantısı; 2. tör-töküntülər; **the ~ of society** cəmiyyətin tör-töküntüləri
**refuse**[2] [rɪ'fju:z] *v* 1. rədd/imtina etmək, rədd cavabı vermək; qəbul etməmək; danmaq; **to ~ one's help** kömək etməmək, köməkdən imtina etmək; **to ~ one's permission** icazə verməkdən imtina etmək; **to ~ a gift/an offer** hədiyyəni/təklifi rədd etmək; *Our application was refused Bizim ərizəmizə rədd cavabı verildi*; 2. *tex.* dayanmaq, işləməmək; *The car absolutely refused to start Maşın əsla xoda düşmədi/işləmədi*; 3. tərslik etmək, tərsliyi tutmaq *(at haq.)*
**refutation** [ˌrefju'teɪʃn] *n* təkzib, təkzib etmə, yalana çıxartma; ~ **of a theory** nəzəriyyəni təkzib etmə
**refute** [rɪ'fju:t] *v* rədd etmək, qəbul etməmək; **to ~ a claim** tələbi rədd etmək; **to ~ a theory** nəzəriyyəni qəbul etməmək



**regain**[1] [rɪ'geɪn] *n* 1. bərpa etmə/edilmə; əvvəlki vəziyyətinə/halına salma; **to ~ one's health** sağlamlığını bərpa etmə; **a ~ of position** vəziyyəti bərpa etmə; 2. geri qaytarma/qaytarılma; geri alma/ alınma
**regain**[2] [rɪ'geɪn] *v* geri almaq/əldə etmək; bərpa etmək; **to ~ consciousness** özünə/huşa gəlmək; **to ~ one's feet/one's footing** yenidən ayağa durmaq; **to ~ one's freedom** yenidən azadlıq qazanmaq; **to ~ one's health** sağlamlığını bərpa etmək, sağalmaq
**regale** [rɪ'geɪl] *v* 1. qonaq etmək/eləmək; **to ~ with** ***smth.*** bir şeyə qonaq etmək/eləmək; 2. əyləndirmək; *She regaled us with tales of her life in the theatre O bizi teatrdakı həyatına dair hekayətlər danışmaqla əyləndirdi*
**regard**[1] [rɪ'ga:d] *n* 1. diqqət, qayğı; **an object of ~** diqqət/qayğı obyekti; **to have ~ to** ***smb./smth.*** bir kəsə/şeyə qayğı göstərmək; **to pay no ~ to** ***smb./smth.*** bir kəsə/şeyə diqqət yetirməmək; *Regard must be paid to it Buna qayğı göstərilməlidir*; 2. hörmət; **to have high ~ for** ***smb.*** bir kəs haqqında yüksək fikirdə olmaq; **to show ~ for** ***smb.*** bir kəsə hörmət göstərmək; 3. *pl* salam; *Give my kind/best regards to your family Mənim səmimi salamlarımı ailənizə yetir/yetirin*; 4. münasibət, münasibət göstərmə; **in/with ~ to** gəldikdə, qaldıqda; **in ~ to internal policy** daxili siyasətə gəldikdə; 5. baxma; **to turn one's ~ on** ***smb.*** bir kəsə baxmaq/nəzər salmaq
**regard**[2] [rɪ'ga:d] *v* 1. hesab etmək; *They regard him as a hero Onlar onu qəhrəman hesab edirlər*; 2. aid/dəxli olmaq; *It doesn't regard me Bunun mənə dəxli yoxdur*; 3. diqqətlə baxmaq; **to ~** ***smb.*** **with curiosity** bir kəsə maraq dolu nəzərlərlə baxmaq; 4. nəzərə almaq, hesablaşmaq; *I don't regard his opinion Mən onun fikrini nəzərə almıram*; 5. hörmət etmək, hörmətini saxlamaq; *He is much regarded Ona çox hörmət edirlər*;
◊ **as ~s** gəldikdə, münasibətdə; *As regards his suggestion I was non-committal Onun təklifinə gəldikdə mən elə bir müəyyən fikir söyləmədim*
**regarding** [rɪ'ga:dɪŋ] *prep* haqqında, barəsində, xüsusunda, dair; -da, -də; **to entertain suspicions ~** ***smb.*** bir kəs haqqında/barəsində şübhələnmək; bir kəsdən şübhələnmək; *What are his intentions regarding you? Sənin/Sizin haqqında/haqqınızda onun fikri/niyyəti nədir?*; **considerations ~ the discussion** müzakirə haqqında mülahizələr/fikirlər
**regardless**[1] [rɪ'ga:dlɪs] *adj* diqqətəlayiq olmayan; **cheap and ~ things** ucuz və diqqətəlayiq olmayan şeylər
**regardless**[2] [rɪ'ga:dlɪs] *adv* nəzərə almadan, diqqət yetirmədən; ~ **expenses** xərci nəzərə almadan
**regardless of** [rɪ'ga:dlɪs əv] *prep* nəzərə almadan, fikir vermədən; ~ **the consequences /danger /expense** nəticəni/ təhlükəni/xərci nəzərə almayaraq; *The club welcomes all new members, regardless of age Yaşı nəzərə almadan klub bütün yeni üzvləri məmnuniyyətlə qəbul edir*
**regency** ['ri:dʒənsɪ] *n* 1. hökumət naibliyi; 2. naibliyin hökmranlığı; 3. naibin hökmranlığında olan ərazi
**regicide** ['redʒɪsaɪd] *n* 1. padşah öldürmə; 2. padşah öldürən, padşah qatili
**regime** [reɪ'ʒi:m] *n* rejim *(dövlət quruluşu, idarə üsulu)*; **a totalitarian/military ~** sosialist/faşist/ totalitar/ hərbi rejim; **a socialist/fascist ~** sosialist/faşist rejimi
**regimen** ['redʒɪmen] *n tib.* rejim, pəhriz; **to follow a strict ~** möhkəm/qəti pəhriz saxlamaq; **a daily ~** gündəlik rejim
**regiment**[1] ['redʒɪmənt] *n* 1. *hərb.* alay; **an infantry/a tank/a cavalry/an armoured ~** piyada/tank/süvari/zirehli qoşun alayı; 2. çox, çoxlu, çox miqdarda; *A whole regiment of volunteers turned up to help Çox miqdarda könüllü köməyə gəldi*
**regiment**[2] ['redʒɪmənt] *v* 1. yeni alay yaratmaq /təşkil etmək; 2. qruplara bölmək, sistemləşdirmək, təşkil etmək; **to ~ industries of a country** ölkənin sənayesini təşkil etmək
**regimental** [ˌredʒɪ'mentl] *adj hərb.* alay; ~ **artillery/device** alay artilleriyası/ emblemi; ~ **headquarters** alay baş qərargahı; ~ **order** alay üzrə əmr; ~ **colours** alay bayrağı; **a ~ band** alay orkestri
**region** ['ri:dʒn] *n* 1. zona, vilayət, ölkə; **the Arctic ~** arktik zona; **the tropical ~s** tropik ölkələr; 2. sahə, dairə; **every ~ of science** elmin hər bir sahəsi; 3. rayon; *The city was divided into seven regions Şəhər yeddi rayona bölündü*; 4. *anat.* boşluq; **the abdominal ~** qarın boşluğu
**regional** ['ri:dʒənl] *adj* rayon, vilayət; yerli; ~ **variations in pronunciation** tələffüzdə yerli variantlar; **the conflict between ~ and national interests** yerli və milli maraqlar arasında toqquşma/ixtilaf; ~ **elections/newspapers** yerli seçkilər/ qəzetlər
**register**[1] ['redʒɪstə$^r$] *n* 1. jurnal; *The teacher called the names on the register Müəllim adları jurnaldan oxudu/çağırdı*; **a ~ of births, marriages and deaths** doğulanların, evlənənlərin və ölənlərin adı qeyd edilən jurnal; 2. qeyd; **a ~ of interment** dəfn haqqında qeyd; 3. *tex.* sayğac, qeyd edən mexanizm/cihaz
**register**[2] ['redʒɪstə$^r$] *v* 1. qeyd etmək, qeydə almaq, yazmaq, siyahıya almaq; 2. yadda saxlamaq; **to ~ a name** adı yadda saxlamaq; 3. göstərmək, qeyd etmək *(cihaz haq.)*; *The thermometer registered 34° Termometr 34° göstərdi*; 4. *d.d.* ifadə etmək; *Her face registered surprise Onun sifəti təəccüb ifadə edirdi*; 5. düz yerinə salmaq; **to ~ every part as perfectly as possible** mümkün ol-

duğu qədər hər bir hissəni düz öz yerinə salmaq; 6. düz/uyğun gəlmək; *The holes register perfectly Deşiklər tam düz gəlir*

**registered** ['redʒɪstəd] *adj* qeyd olunmuş, siyahıya alınmış/salınmış; sifarişli; **a ~ letter** sifarişli məktub

**registration**[1] [.redʒɪs'treɪʃn] *n* qeyd, qeydə alma /alınma; qeyd etmə/edilmə/olunma; **the ~ of letters/parcels** məktubların/ bağlamaların qeydə alınması; **the ~ of the students for examination** imtahan üçün tələbələrin qeydə alınması; *Please queue here for registration Zəhmət olmasa, qeydiyyat üçün burada növbəyə dur/durun*

**registration**[2] [.redʒɪs'treɪʃn] *adj* qeydiyyat; **~ number** qeydiyyat nömrəsi; **~ fees** qeydiyyat haqqı

**registry** ['redʒɪstrɪ] *n* 1. qeyd/qeydiyyat şöbəsi *(idarədə)*; 2. qeyd etmə/olma; 3. qeyd/qeydiyyat jurnalı

**regress** [rɪ'gres] *v* 1. əks istiqamətdə hərəkət etmək; 2. geriləmək, dala getmək, tənəzzül etmək; geri qayıtmaq; *She regressed to her old habits O, köhnə adətlərinə qayıtdı*

**regression** [rɪ'greʃn] *n* başlanğıc nöqtəyə /əvvəlki vəziyyətə qayıtma

**regressive** [rɪ'gresɪv] *adj* geri, geriyə; **~ assimilation** *fon.* geri/geriyə assimilyasiya

**regret**[1] [rɪ'gret] *n* 1. təəssüf, heyfsilənmə, peşman olma, peşmançılıq; **to feel ~ about a missed opportunity** əldən verilmiş imkan üçün peşmançılıq hiss etmək; **to express ~ at *smb.'s* death** bir kəsin ölümünə təəssüf etmək; 2. *pl* üzr, üzr istəmə; **to express ~ for *smth.*** bir şeyə görə üzr istəmək

**regret**[2] [rɪ'gret] *v* (-tt-) təəssüf etmək, heyfsilənmək; peşman olmaq, peşmançılıq çəkmək; *His death was regretted by all Onun ölümünə hamı heyfsiləndi/ təəssüf etdi; If you go now, you will regret it Əgər indi getsən/getsəniz, peşman olacaqsan/olacaqsınız*

**regretful** [rɪ'gretfl] *adj* təəssüf edən, kədərli, qüssəli, qəmli, pərişan; peşman olan, peşmançılıq çəkən

**regretfully** [rɪ'gretfəlɪ] *adv* təəssüflə, peşmançılıqla, peşman-peşman, qüssəli/ pərişan bir surətdə

**regrettable** [rɪ'gretəbl] *adj* hüznlü, kədərli; təəssüfəlayiq, təəssüf olunacaq/ediləcək /doğuracaq; **a ~ mistake** təəssüfəlayiq /təəssüf doğuracaq səhv

**regroup** [.ri:'gru:p] *v* yenidən qruplaşdırmaq /qruplaşma aparmaq

**regulable** ['regjuləbl] *adj* nizama/qaydaya salına bilən, tənzim edilən/edilə bilən

**regular**[1] ['regjulə^r] *n adət. pl* 1. daimi ordu; 2. daimi müştəri; *He is one of our regulars O bizim daimi müştərilərimizdən biridir*

**regular**[2] ['regjulə^r] *adj* 1. düzgün, müntəzəm, ritmli, normal; **~ attendance** müntəzəm davamiyyət; **~ pulse** düzgün/müntəzəm/ritmli nəbz; **~ footsteps** ritmli/düzgün/müntəzəm addımlar; **~ work** müntəzəm iş; **~ life** normal həyat; **~ breathing** müntəzəm/normal nəfəs alma; **~ teeth** normal dişlər; 2. daimi; **~ customers/readers/listeners** daimi müştərilər/oxucular/dinləyicilər; **~ work** daimi iş; **a ~ army** daimi ordu; **~ troops** daimi qoşun; *He has no regular work Onun daimi işi yoxdur*; **a ~ staff** daimi ştat; **a ~ lecturer** ştatda olan mühazirəçi/müəllim; 3. ixtisaslı, professional; **~ cook** ixtisaslı/professional aşpaz; 4. *qram.* qaydalı; **~ verbs** qaydalı fellər

**regularity** [.regju'lærɪtɪ] *n* düzgünlük, doğruluq; müntəzəmlik; **the ~ of her attendance at church** onun kilsəyə davamiyyətinin müntəzəmliyi; *Economic crises recur with regularity İqtisadi böhranlar müntəzəm olaraq baş verir*

**regularize, -ise** ['regjuləraɪz] *v* qaydaya salmaq, yoluna qoymaq, sahmanlamaq

**regularly** ['regjələlɪ] *adv* 1. düz, doğru, düzgün; ritmik, səlis; bir ölçüdə; 2. müntəzəm, müntəzəm olaraq/surətdə

**regulate** ['regjuleɪt] *v* 1. qaydaya/nizama/ sahmana salmaq, yoluna qoymaq, sahmanlamaq, düzəltmək; idarə etmək; **to ~ the traffic** küçə hərəkətini qaydaya/ nizama salmaq/idarə etmək; **to ~ *one's* conduct** öz hərəkətlərinə nəzarət etmək; **measures to ~ the traffic** küçə hərəkətini nizama salmaq üçün tədbirlər; 2. tənzimləmək, yoxlamaq, yoxlayıb düzəltmək *(cihazı)*; **to ~ a clock** saatı yoxlayıb düzəltmək; **to ~ heat** istini tənzimləmək

**regulation**[1] [.regju'leɪʃn] *n* 1. qaydaya/ nizama salma, yoluna qoyma; **~ of affairs** işləri qaydaya/nizama salma; 2. tənzimləmə, yoxlayıb qaydaya salma, uyğunlaşdırma, tarazlaşdırma; 3. *pl* qaydalar, nizamnamə; daxili nizam qaydaları; **road ~s** küçə hərəkəti qaydaları; **hospital ~s** xəstəxananın daxili nizam qaydaları; **safety ~s** təhlükəsizlik qaydaları; **contrary to/against ~s** qaydanın əksinə/ziddinə; qaydanı pozma; **to bring under ~s** nizama/qaydaya salmaq, müəyyən qaydaya/nizama tabe etmək

**regulation**[2] [.regju'leɪʃn] *adj* müəyyən/ təyin edilmiş, göstərilmiş; **~ speed** müəyyən edilmiş sürət; **to exceed ~ speed** göstərilmiş sürəti keçmək; **~ distance** *hərb.* təyin edilmiş/göstərilmiş məsafə/ara; **in ~ uniform** təyin edilmiş geyimdə

**regulator** ['regjuleɪtə^r] *n* 1. tənzimçi, nizama/qaydaya salan; 2. *tex.* tənzimçi, nizamlayıcı *(cihaz)*

**rehabilitate** [.ri:ə'bɪlɪteɪt] *v* 1. bəraət qazandırmaq, hüququnu özünə qaytarmaq; **to ~ prisoners** dustaqlara bəraət qazandırmaq; 2. təmizə çıxartmaq; **to ~ a disgraced former leader** bədnam olmuş əvvəlki rəhbəri təmizə çıxartmaq; 3. bərpa etmək, əvvəlki halına salmaq, əvvəlki vəziyyətinə qaytarmaq; təmir etmək



**rehabilitation** [.ri:ə.bɪlɪ'teɪʃn] *n* 1. bəraət, bəraət qazandırma, hüququnu özünə qaytarma; 2. təmizə çıxartma; 3. bərpa/təmir etmə

**rehear** [.ri:'hɪə^r] *v* (*pt, pp* **reheard** [.ri:'hə:d]) *hüq.* işi ikinci dəfə dinləmək, işə ikinci dəfə baxmaq *(məhkəmədə)*

**rehearsal** [rɪ'hə:sl] *n* 1. repetisiya, məşq, məşq etmə; **dress ~** son/axırıncı məşq; 2. təkrar, təkrar etmə; **~ of old grievances** köhnə şikayətləri təkrar etmə

**rehearse** [rɪ'hə:s] *v* 1. repetisiya/məşq etmək; *They are rehearsing for a new TV show Onlar yeni televiziya tamaşasını məşq edirlər*; 2. təkrar etmək; sadalamaq; *He rehearsed the interview in his mind beforehand O, intervyusunu/müsahibəsini əvvəlcədən başında/fikrində təkrar etdi*; 3. ifadəli oxumaq, təmtəraqla söyləmək

**reheat** [.ri:'hi:t] *v* yenidən/təkrarən qızdırmaq *(xörəyi və s.)*; *Leave the soup to stand for two hours and then reheat it Qoy/Qoyun şorba iki saat qalsın, sonra onu yenidən qızdır/qızdırın*

**reheater** ['ri:hi:tə^r] *n tex.* qızdırıcı cihaz

**rehouse** ['ri:'haus] *v* yeni evə köçmək/köçürülmək

**rehousing** ['ri:'hauzɪŋ] *n* yeni evə köçürmə, yeni mənzil vermə

**reign**[1] [reɪn] *n* 1. şahlıq/padşahlıq/çarlıq etmə, səltənət sürmə; **in the ~ of Shah Ismayil** Şah İsmayılın şahlığı dövründə; 2. hakimiyyət; hökmranlıq, ağalıq; **under the ~ of** hakimiyyəti altında; **the ~ of law** qanunun hökmranlığı; **in/during the ~ of King Alfred** Kral Alfredin hökmranlığı dövründə/zamanında

**reign**[2] [reɪn] *v* 1. padşahlıq/çarlıq etmək, səltənət sürmək; hökmranlıq etmək; 2. hökm sürmək; *Silence reigned Sükut hökm sürdü*

**reigning** ['reɪnɪŋ] *adj* padşahlıq/çarlıq edən, səltənət sürən; hökmranlıq edən; **~ dynasty** hökmranlıq edən sülalə

**rein** [reɪn] *n* 1. cilov, yedək; **to draw ~** 1) cilovu çəkmək, atı dayandırmaq; 2) *məc.* xərcləri azaltmaq; 2. yüyən *(qoşqu ləvazimatı)*

**reindeer** ['reɪndɪə^r] *n zool.* şimal maralı

**reinforce** [.ri:ɪn'fɔ:s] *v* 1. gücləndirmək, qüvvətləndirmək, gücünü/qüvvəsini artırmaq; bərkitmək, möhkəmlətmək; **to ~ troops at the front** cəbhədə olan qoşunu möhkəmlətmək, cəbhəyə əlavə qoşun göndərmək; *He reinforced his promise by his word of honour O öz vədini vicdanına and içməklə möhkəmlətdi*; 2. *tik.* armaturlaşdırmaq, armatur daxil etməklə möhkəmliyini artırmaq *(betonun)*

**reinforced** [.ri:ɪn'fɔ:st] *adj* 1. qüvvətləndirilmiş, gücləndirilmiş, gücü/ qüvvəsi artırılmış, möhkəmləndirilmiş; **~ combat team** qüvvətləndirilmiş/ möhkəmləndirilmiş hərbi taqım; 2. *tik.* armaturlaşdırılmış, içinə armatur qoyulmuş *(beton haq.)*; **~ concrete** *tik.* dəmir-beton

**reinforcement** [.ri:ɪn'fɔ:smənt] *n* 1. gücləndirmə, qüvvətləndirmə, möhkəmləndirmə; 2. *tik.* armaturlaşdırma, içinə armatur qoyma *(betonun)*

**reinless** ['reɪnlɪs] *adj* 1. cilovsuz, yüyənsiz; **a ~ rider** yüyənsiz/cilovsuz at; 2. nəzarətsiz; **~ speed** son dərəcə iti sürət; 3. azğın, özbaşına; şiddətli

**reinstate** [.ri:ɪn'steɪt] *v* 1. əvvəlki vəziyyətinə qaytarmaq, əvvəlki hüquqları bərpa etmək; **to ~ *smb.* in possessions** bir kəsin sahiblik hüququnu qaytarmaq/bərpa etmək; **to ~ *smb.* in his former office** bir kəsi əvvəlki vəzifəsinə bərpa etmək; 2. qaydaya/nizama salmaq; 3. sağaltmaq, sağlamlığı bərpa etmək

**reinstatement** [.ri:ɪn'steɪtmənt] *n* 1. əvvəlki hüquqlarını/vəziyyətini bərpa etmə; 2. bərpa etmə, qaydaya/nizama salma

**reinsurance** [.ri:ɪn'ʃuərns] *n* yenidən sığorta etmə, sığortanı bərpa etmə

**reinvest** [.ri:ɪn'vest] *v* 1. yenidən qoymaq/ yerləşdirmək *(yatırım haq.)*, yenidən investisiya /maya/kapital qoymaq; 2. hüququ bərpa etmək; 3. yenidən paltar/ geyim vermək; *Officers were invested with new uniforms Zabitlərə yeni geyim/paltar verdilər*

**reinvestment** [.ri:ɪn'vestmənt] *n* yenidən maya /yatırım/kapital qoyma

**reissue**[1] [.ri:'isju:] *n* yenidən nəşr etmə/edilmə; yeni nəşr

**reissue**[2] [.ri:'isju:] *v* 1. yenidən/təkrar nəşr etmək; **to ~ a book/a stamp** yenidən kitab/marka nəşr etmək; 2. yenidən zərb etmək *(sikkə haq.)*; **to ~ a coin** yenidən sikkə zərb etmək

**reiterate** [ri'ɪtəreɪt] *v* 1. təkrar etmək; **to ~ an argument/a demand/an offer** dəlili/tələbi/təklifi təkrar etmək; *"Go away! Go away" he reiterated "Çıx get/ Çıxın gedin!" deyə o, təkrar etdi*; 2. təkrar olunma; *The knocking was reiterated Tıqqıltı təkrar olundu*

**reiteration** [ri.ɪtə'reɪʃn] *n* təkrar, təkrar etmə/edilmə; *It needs no reiteration Bunu təkrar etməyə ehtiyac yoxdur*

**reject**[1] [rɪ'dʒekt] *n* brak, zay mal; *The rejects are sold off cheaply Zay mallar ucuz satılır*

**reject**[2] [rɪ'dʒekt] *adj* brak, zay; **~ china/ furniture/clothing** zay çini/mebel/geyim

**reject**[3] [rɪ'dʒekt] *v* 1. rədd etmək, qəbul etməmək; **to ~ an offer/a gift/an invitation** təklifi/hədiyyəni/dəvəti rədd etmək; *The proposal was firmly/flatly rejected Təklif qəti olaraq rədd edildi*; **to ~ a bill in Parliament** qanun layihəsini Parlamentdə qəbul etməmək; 2. brak etmək/çıxartmaq, zay hesab etmək; **to ~ a product** malı/məmulatı brak çıxartmaq/zay hesab etmək; 3. imtina etmək; *The child was rejected by its parents Valideynləri uşaqdan imtina etdilər*

**rejection** [rɪ'dʒekʃn] *n* rədd etmə/edilmə; boyun qaçırma, imtina etmə; qəbul etməmə; **the ~ of the bill** qanun layihəsini rədd etmə/qəbul etməmə; *Her proposal met unanimously rejection Onun təklifi hamılıqla rədd edildi*

**rejoice** [rɪ'dʒɔɪs] *v* 1. sevindirmək, şadlandırmaq, fərəhləndirmək, şad etmək; *Your letter rejoiced my heart Sənin/Sizin məktubun/məktubunuz məni sevindirdi/mənim qəlbimi sevinclə doldurdu*; 2. (**in, at**) sevinmək, şadlanmaq, fərəhlənmək, şad olmaq; **to ~ at/in** ***smb.'s*** **success** bir kəsin müvəffəqiyyətinə sevinmək/şad olmaq; **to ~ at the good news** yaxşı xəbərdən sevinmək/şadlanmaq; *We rejoiced that the war was over Biz müharibənin qurtarmasına sevindik/şad olduq; There is no reason to rejoice Sevinməyə əsla səbəb yoxdur*

**rejoicing** [rɪ'dʒɔɪsɪŋ] *n* şadlıq, şənlik, nəşə, sevinc, fərəh; bayram, bayram etmə; *There was loud rejoicing after the victory Qələbədən sonra səs-küylü şadlıq/şənlik var idi*

**rejoin** [ˌriː'dʒɔɪn] *v* 1. yenidən birləşmək/ daxil olmaq; **to ~ a club** kluba yenidən daxil olmaq; **to ~ the army** yenidən orduya daxil olmaq; *The broken pieces were rejoined and glued Qırılmış parçalar birləşdirildi və bitişdi*; 2. yenidən birləşmək /qoşulmaq; *I'll rejoin you at the station Mən sizə vağzalda yenidən qoşulacam*; **to ~** ***one's*** **unit** *hərb.* yenidən öz hissəsinə qayıtmaq

**rejoinder** [rɪ'dʒɔɪndəʳ] *n* kəskin və qısa cavab; *"No!" was his curt rejoinder "Xeyr!" deyə o, kəskin və qısa cavab verdi*

**rejuvenate** [rɪ'dʒuːvəneɪt] *v* cavanlaşdırmaq, gəncləşdirmək; *This cream will rejuvenate your skin Bu krem sənin/sizin dərini/dərinizi cavanlaşdıracaq*; **to feel ~ed after a long holiday** uzunmüddətli istirahətdən sonra özünü cavan hiss etmək

**rejuvenation** [rɪˌdʒuːvɪ'neɪʃn] *n* cavanlaşdırma, gəncləşdirmə; cavanlaşma, gəncləşmə

**rekindle** [ˌriː'kɪndl] *v* 1. yenidən yandırmaq; **to ~ a fire** ocağı yenidən qalamaq; 2. oyatmaq, doğurmaq; **to ~ hopes** yeni ümidlər oyatmaq/doğurmaq; 3. yenidən alışmaq/yanmaq

**relapse¹** [rɪ'læps] *n* təkrar, təkrar edilmə/ etmə; **a ~ of old errors** köhnə səhvlərin təkrarı/təkrar edilməsi

**relapse²** [rɪ'læps] *v* 1. yenidən əvvəlki vəziyyətə qayıtmaq; **to ~ into silence** yenidən susmaq; **to ~ into crime** yenidən cinayətə qurşanmaq; 2. yenidən xəstələnmək; 3. yenidən qiymətləri aşağı düşmək *(qiymətli kağızlar haq.)*

**relate** [rɪ'leɪt] *v* 1. danışmaq, nağıl etmək; **to ~ a story** hekayə danışmaq/nağıl etmək; *He related his adventures O öz macəraları haqqında bizə danışdı*; 2. əlaqələndirmək, əlaqə və ya münasibət yaratmaq; **to ~ theory and practice** nəzəriyyə və təcrübə arasında əlaqə yaratmaq, nəzəriyyəni təcrübə ilə əlaqələndirmək; *It's difficult to relate these phenomena to/with each other Bu iki hadisəni əlaqələndirmək çətindir*; 3. aid/aidiyyəti olmaq; *He notices nothing but what relates to himself O ancaq ona aid olan məsələyə diqqət yetirir*; 4. *d.d.* qohum olmaq

**related** [rɪ'leɪtɪd] *adj* 1. əlaqəli; **~ questions** əlaqəli məsələlər; 2. qohumluq əlaqəsi olan, qohum; *We're distantly related Biz uzaq qohumlarıq*

**relation** [rɪ'leɪʃn] *n* 1. nağıl/hekayə etmə, danışma; nağıl, hekayə; **the ~ of** ***one's*** **adventures** macəralarını nağıl etmə/danışma; 2. əlaqə, münasibət; asılılıq; **~ of forces** qüvvələrin əlaqəsi/münasibəti; **the ~ between weather and crops** hava və məhsul arasında qarşılıqlı əlaqə/asılılıq; **to have ~ to** ***smth.*** bir şeylə əlaqəsi olmaq; **to be out of (all) ~ to** heç bir əlaqəsi olmamaq; 3. *pl* münasibətlər; **strained ~s** tarımlanmış/gərgin münasibətlər; **to entertain friendly ~s with** ***smb.*** bir kəslə dostluq əlaqələri saxlamaq; **international ~s** beynəlxalq əlaqələr; **foreign ~s** xarici əlaqələr; **good neighbourly ~s** yaxşı qonşuluq əlaqələri; **to enter into diplomatic ~s** diplomatik əlaqələr yaratmaq; **to break off diplomatic ~s** beynəlxalq əlaqələri kəsmək; 4. qohum; **near/distant ~** yaxın/uzaq qohum; *He's no relation to me O mənim əsla qohumum deyil*; **~ on the mother's/father's side** ana/ata tərəfdən qohum

**relational** [rɪ'leɪʃənl] *adj* 1. nisbi; **~ nature of space** məkanın nisbi xarakteri; 2. qohumluq; **~ duties** qohumluq borcu

**relationship** [rɪ'leɪʃnʃɪp] *n* 1. qohumluq, qohumluq əlaqəsi; 2. münasibət, qarşılıqlı əlaqə, əlaqə

**relative¹** ['relətɪv] *n* qohum; **close/distant ~s** yaxın/uzaq qohumlar; **friends and ~s** dostlar və qohumlar

**relative²** ['relətɪv] *adj* 1. nisbi, qarşılıqlı; **~ position** qarşılıqlı vəziyyət; **~ density** *fiz.* nisbi sıxlıq; 2. şərti; *Beauty is relative Gözəllik şərtidir; Supply must be relative to demand Təchizat tələbata müvafiq olmalıdır*; 3. *qram.* nisbi; **~ pronouns** nisbi əvəzliklər

**relatively** ['relətɪvlɪ] *adv* nisbətən; müqayisəli; olduqca/dedikcə çox; *It's relatively cold/hot today than it was yesterday Bu gün dünənə nisbətən soyuqdur/istidir*; **to learn languages ~** dilləri müqayisəli öyrənmək; *In spite of her illness, she's relatively cheerful Xəstəliyinə baxmayaraq, o dedikcə/ olduqca gümrahdır*;
◊ *Relatively speaking... Ümumiyyətlə desək... Doğrusunu desək...; Relatively speaking, this matter is unimportant Doğrusunu desək, bu məsələ vacib deyil*

**relativism** ['relətɪvɪzm] *n fəls.* relativizm *(biliklərin nisbi olduğuna görə, varlığın obyektiv surətdə dərk oluna bilməsini inkar edən idealist fəlsəfi nəzəriyyə)*



**relativity** [ˌrelə'tɪvɪtɪ] *n* nisbilik; nisbilik nəzəriyyəsi; **Einstein's Theory of Relativity** Eynşteynin nisbilik nəzəriyyəsi

**relax** [rɪ'læks] *v* 1. boşaltmaq; yumşaltmaq *(cəzanı)*; **to ~ discipline** intizamı zəiflətmək; **to ~** ***one's*** **hands** əllərini boşaltmaq; *Let your muscles relax slowly Qoy/Qoyun əzələlərin/əzələləriniz yavaş-yavaş boşalsın*; 2. zəifləmək; zəifləşmək; *His muscles relaxed Onun əzələləri zəiflədi*; 3. azaltmaq *(gərginliyi)*; **to ~** ***one's*** **efforts** səylərini/ cəhdlərini azaltmaq; **to ~ international tension** beynəlxalq gərginliyi azaltmaq; 4. azalmaq, zəifləmək; *The cold/heat is relaxing Soyuq/İsti zəifləyir/azalır*; 5. dincəlmək; **to ~ for an hour/for a week** bir saat/bir həftə dincəlmək; *I like to relax with a good book/with a glass of wine when I get home from work Mən işdən evə qayıdandan sonra yaxşı kitab oxumaqla/bir qədəh şərab içməklə dincəlməyi xoşlayıram*;
◊ **to ~ the bowels** bağırsaqları boşaltmaq

**relaxation** [ˌriːlæk'seɪʃn] *n* 1. boşalma, zəifləmə; **~ of muscles** əzələlərin boşalması/zəifləməsi; 2. azalma *(gərginlik və s. haq.)*, düşmə, əskilmə; **~ of tension** gərginliyin azalması; 3. istirahət, tənəffüs; əyləncə; **~ after the day's toil** gündəlik zəhmətdən sonra dincəlmə; **to seek ~ in books** kitab oxumaqla dincəlmək; **to take some ~** bir az dincəlmək/tənəffüs etmək; *The President doesn't have much time for relaxation Prezidentin istirahət üçün vaxtı azdır*; 4. zəifləmə; **the ~ of discipline** intizamın zəifləməsi; **the ~ of the royal authority** kral hakimiyyətinin zəifləməsi

**relaxed** [rɪ'lækst] *adj* sakit, dinc, aram, arxayın, rahat, xatircəm; **a ~ atmosphere in the classroom** sinifdə sakit şərait/mühit; *She looked very relaxed after her trip Səyahətdən sonra o çox xatircəm/rahat/sakit görünürdü*

**relaxing** [rɪ'læksɪŋ] *adj* yumşaldıcı, sakitləşdirici, zəifləşdirici; **a ~ bath/ holiday** sakitləşdirici hamam/ istirahət

**relay¹** ['riːleɪ] *n* 1. *id.* estafet *(komandaların qaçış/üzgüçülük yarışında)*; 2. estafetin mərhələləri; 3. poçt məntəqəsi; *I rode to the next (post) relay Mən o biri/növbəti poçt məntəqəsinə çapdım*; 4. növbə; **to work in/by ~s** növbə ilə işləmək; 5. dəyişmə *(xüs. atı)*

**relay²** ['riːleɪ] *v* (*pt, pp* **relayed** *və ya* **relaid**) 1. dəyişmək *(xüs. atı)*; 2. mərhələlərlə keçirmək; 3. *el.* ötürmək; translyasiya etmək

**relay baton** ['riːleɪ'bætn] *n* estafet ağacı

**re-lay** [riː'leɪ] *v* (*pt, pp* **re-laid**) 1. boru çəkmək; 2. xalçanı yenidən salmaq; 3. yol çəkmək; **to ~ of rails** relsləri dəyişdirmək

**release¹** [rɪ'liːs] *n* 1. azad etmə/edilmə/ olma, buraxma, buraxılma; **~ a prisoner/ hostage** dustağı/girovu azad etmə; **to grant a ~ from debt** borcdan azad etmək; **a ~ from care** qayğıdan azad etmə; 2. *hərb.* tərxis etmə; **~ from active duty** fəal xidmətdən azad etmə; 3. yeni məhsul buraxma; 4. yeni film; yeni filmi ekrana buraxma; 5. çap olunmağa icazə vermə *(kitab və s. haq.)*

**release²** [rɪ'liːs] *v* 1. azad/xilas etmək, qurtarmaq; **to ~ a prisoner/a hostage from captivity** dustağı/girov götürülmüş adamı əsirlikdən azad /xilas etmək; *She gently released herself from his arms/ embrace O, nəzakətlə özünü onun qollarından/ağuşundan azad etdi; Death released him from his sufferings Ölüm onu əzablarından qurtardı*; 2. buraxmaq; **to ~ horses into the field** atları çölə buraxmaq; **to ~ a movie/a book** kinofilm/ kitab buraxmaq; *New products were released into the market Yeni məhsullar bazara buraxıldı*; **to ~ a bird** quşu buraxmaq *(qəfəsdən)*; **to ~ the break** əyləci/tormozu buraxmaq; 3. nəşrinə/ çapına icazə vermək *(kitab və s. haq.)*; *The speech was released to the press Nitqin qəzetdə çap olunmasına icazə verildi*

**relegate** ['relɪgeɪt] *v* (**to**) 1. göndərmək, yollamaq; **to ~ to the reserve** *hərb.* ehtiyata buraxmaq/göndərmək; 2. keçirmək, keçmək *(yuxarı qrupdan aşağı qrupa)*; *Everyone was surprised when Manchester United were relegated Mançestr Yunayted komandası aşağı qrupa keçəndə hamı təəccübləndi*; 3. həll etmək/baxılmaq üçün vermək *(məsələni, sənədi)*; **to ~ the matter to the committee** işi/məsələni həll etmək üçün komitəyə göndərmək; 4. tapşırmaq; **to ~ certain duties to subordinates** müəyyən vəzifələri öz tabeliyində olan adamlara tapşırmaq; 5. təhvil vermək, göndərmək *(arxivə)*; 6. *id.* aşağı dərəcəyə keçirmək *(xüs. komandanı)*

**relegation** [ˌrelɪ'geɪʃn] *n* 1. yerinə yetirmək və ya həll etmək üçün göndərmə *(işi, məsələni)*; 2. *id.* aşağı dərəcəyə keçirmə; **teams threatened with ~** aşağı dərəcəyə keçmə qorxusu altında olan komandalar

**relent** [rɪ'lent] *v* yumşalmaq, mülayimləşmək; yüngülləşmək

**relentless** [rɪ'lentlɪs] *adj* 1. amansız, qəddar, insafsız, rəhmsiz, zalım, daşürəkli, sərt; **~ enemy** amansız /qəddar/insafsız düşmən; **~ judge/criticism** sərt/amansız hakim/ tənqid; 2. daimi, sürəkli, arasıkəsilməz; **~ rains** sürəkli/arasıkəsilməz yağışlar

**relentlessly** [rɪ'lentlɪslɪ] *adv* amansızcasına, qəddarcasına, insafsızcasına, amansız/ insafsız bir surətdə

**relevance** ['relɪvəns] *n* = **relevancy**

**relevancy** ['relɪvənsɪ] *n* uyğunluq, münasiblik; **to have/to bear no ~ to the matter** məsələyə münasib/uyğun olmamaq; **historical events of contemporary ~** müasir dövrə uyğun tarixi hadisələr; *His answer came with relevancy Onun cavabı münasib oldu*

**relevant** ['relɪvənt] *adj* münasib, uyğun, məsə-

layə dəxli olan; **a ~ argument/ suggestion** münasib dəlil/mühakimə; **to have all the ~ documents ready** məsələyə dəxli olan bütün sənədlərə malik olmaq

**reliability** [rɪ.laɪə'bɪlɪtɪ] *n* etibarlılıq, mötəbərlik, möhkəmlik; **the ~ of public transport** ictimai nəqliyyatın etibarlılığı; **the ~ of the source** mənbəyin etibarlılığı /mötəbərliliyi

**reliable** [rɪ'laɪəbl] *adj* etibarlı, mötəbər, sadiq; bel bağlana bilən, etibar edilən; **a ~ assistant/witness** etibar edilə bilən köməkçi/şahid; **a ~ goalkeeper** mötəbər/ etibar edilə bilən qapıçı *(futbolda)*; **a ~ car/watch** mötəbər maşın/saat; **a ~ information** mötəbər məlumat; **a ~ friend** etibarlı/sadiq dost

**reliably** [rɪ'laɪəblɪ] *adv* sədaqətlə, etibarla, mötəbərcəsinə

**reliance** [rɪ'laɪəns] *n* **1.** inam, etibar, etimad; əminlik, əzm, qətilik; **to have/to put/to place ~ in/on/upon** *smb./smth.* bir kəsə/şeyə inanmaq; *I put little reliance in him Mən ona çox da inanmıram/etibar etmirəm*; **2.** dayaq, ümid; *His chief reliance was his own courage Onun əsas ümidi öz cəsurluğuna idi, O əsasən öz cəsarətinə ümid edirdi*

**reliant** [rɪ'laɪənt] *adj* **1.** arxayın, xatircəm; inanmış; **to be ~ on** *smb.* bir kəsə inanmaq/etibar etmək/bel bağlamaq; **2.** asılı, asılı olan; **to be ~ on** *smb.* bir kəsdən asılı olmaq *(maddi cəhətdən)*; *He's heavily reliant on bank loans O tamamilə bank borclarından asılıdır*

**relic** ['relɪk] *n* **1.** iz, qalıq; **~s of early civilization** erkən mədəniyyətin qalıqları; *Stone implements are precious relics of prehistoric times Daş alətlər tarixdən qabaqkı vaxtların/dövrlərin qiymətli qalıqlarıdır*; **2.** suvenir, yadigar, əmanət; **to keep** *smth.* **for a ~** bir şeyi əmanət/yadigar olaraq saxlamaq

**relief** [rɪ'li:f] *n* I **1.** yüngülləşdirmə, asanlaşdırma; yüngüllük, asanlıq; *The medicine gave some relief Dərman bir az yüngüllük verdi*; **2.** aşağı düşmə; **~ of pressure** təzyiqin aşağı düşməsi; **3.** rahatlıq, müxtəliflik; *The trees were a relief to the eyes Ağaclar gözə rahatlıq verirdi*; **4.** maddi yardım, pul köməyi; müavinət *(işsizlər üçün)*; **5.** kömək; **to come to** *smb.***'s~** bir kəsin köməyinə gəlmək/yetmək; **6.** növbətçini dəyişmə, növbətçilikdən azad etmə; **7.** *hüq.* azad etmə *(məsuliyyətdən, cərimədən və s.)*

**relief** [rɪ'li:f] *n* II **1.** *inş.* qabarıq; **high ~** qorelyef *(hündür qabarıqlı naxış/skulptura)*; **low ~** barelyef, qabartma, qabarıq naxış/ bəzək; **2.** *coğ.* relyef *(yer səthinin quruluşu)*; **3.** aydınlıq, dəqiqlik; **4.** təzad, ziddiyyət; **5.** xüsusi olaraq ayırma/nəzərə çatdırma/çarpdırma; **to place in strong ~** xüsusi olaraq nəzərə çatdırmaq/çarpdırmaq

**relieve** [rɪ'li:v] *v* **1.** yüngülləşdirmək, zəiflətmək; **to ~ cough** öskürəyi yüngülləşdirmək/zəiflətmək; **2.** sakitləşdirmək; təsəlli/təskinlik vermək, sakit etmək; **to ~** *smb.***'s mind** bir kəsi sakitləşdirmək, bir kəsə təskinlik/təsəlli vermək; **3.** kömək etmək, köməklik göstərmək, köməyə çatmaq/gəlmək; **to ~ a besieged town** mühasirəyə alınmış şəhərin köməyinə gəlmək; **4.** dəyişdirmək; dəyişmək; **to ~ a sentry** növbətçini/gözətçini dəyişmək; **5.** azad etmək *(bir şeydən)*; **to ~** *smb.* **of responsibility** bir kəsi məsuliyyətdən azad etmək; **6.** bir kəsi azad etmək *(vəzifədən və s.)*; **to ~** *smb.* **of his rank** bir kəsi rütbəsindən azad etmək;

◊ **to ~ nature/oneself** sidik/nəcis ifraz etmək, qarnını boşaltmaq; işəmək, siymək

**religion** [rɪ'lɪdʒn] *n* **1.** din; dini təlim; **the Christian/Jewish ~** xristian/yəhudi dini; **2.** rahiblik; **to lead the life of ~** rahib həyatı yaşamaq; **to enter into ~** rahib olmaq; **3.** kult, sitayiş, pərəstiş; **to make (a) ~ of** *smth.* bir şeydən kult yaratmaq, bir şeyə sitayiş etmək

**religious** [rɪ'lɪdʒəs] *adj* **1.** dini; **a ~ belief** dini inam; **a ~ service** dini xidmət, ibadət; **2.** dindar; **a very ~ man** çox dindar adam; **3.** *məc.* vicdanlı, insaflı; dəqiq; **~ neatness** dəqiq səliqəlilik; **4.** rahib, zahid, asket; **a ~ house** monastır; **a ~ order** rahib ordeni

**religiously** [rɪ'lɪdʒəslɪ] *adv* **1.** dindarcasına, dindar kimi; **2.** çox diqqətlə/dəqiqliklə; *I phone her religiously every day Mən hər gün dəqiqliklə ona zəng edirəm*

**religiousness** [rɪ'lɪdʒəsnɪs] *n* **1.** dindarlıq; **2.** dəqiqlik, diqqətlilik

**relinquish** [rɪ'lɪŋkwɪʃ] *v* əl çəkmək, atmaq, tərk etmək; **to ~ hope** ümiddən əl çəkmək, ümidi kəsmək; **to ~ an idea** fikirdən əl çəkmək; **to ~ a position** *hərb.* mövqeyi vermək, mövqeyi tərk etmək

**relinquishment** [rɪ'lɪŋkwɪʃmənt] *n* **1.** təhvil vermə/verilmə, tərk etmə/edilmə; **2.** *hüq.* imtina, imtina etmə; **~ of** *one's* **property** öz əmlakından/mülkündən imtina etmə; **~ of a succession** varislikdən imtina etmə

**relish**[1] ['relɪʃ] *n* **1.** həzz, zövq, ləzzət, kef, səfa; nəşə; **to eat with great ~** çox böyük ləzzətlə yemək; **to have a ~ for** *smth.* bir şeyə meylli olmaq; **2.** xoşagəlməyən iy/ dad/tam; **~ of garlic** sarımsaq tamı; **3.** məzə, çərəz, xuruş; **4.** cazibə, məlahət, cazibədarlıq; **to lose ~** cazibədarlığı/ məlahəti itirmək;

◊ *Hunger is the best relish ≅ Aclıq ən yaxşı xuruşdur, Ac olanda hər cür yemək adama ləzzətli gəlir*

**relish**[2] ['relɪʃ] *v* **1.** həzz/ləzzət almaq; ləzzətlə/iştaha ilə yemək; dadmaq, tamına baxmaq; *He relished his breakfast O, səhər yeməyini iştaha ilə yedi*; **2. (of)** dad vermək

**relive** [.ri:'lɪv] *v* yenidən yaşamaq; **to ~ the horrors of war** müharibənin dəhşətlərini yenidən yaşamaq



**reload** [.ri:'loud] *v* **1.** yenidən yükləmək; **2.** yenidən doldurmaq *(silahı və s.)*

**relocate** ['ri:lou'keɪt] *v* yerini dəyişmək, başqa yerə köçürtmək; **to ~ the command post** komanda məntəqəsinin yerini dəyişmək

**relocation** ['ri:lou'keɪʃn] *n* yerdəyişmə, yerini dəyişdirmə, köçürmə, köçürdülmə; başqa yerdə yerləşdirmə

**reluct** [rɪ'lʌkt] *v* **(against, at)** bunt /qiyam qaldırmaq, qiyam etmək, iğtişaş salmaq, etiraz etmək; müqavimət göstərmək; **to ~ against oppression** zülmə qarşı ayağa qalxmaq/etiraz etmək/qiyam qaldırmaq

**reluctance** [rɪ'lʌktəns] *n* **1.** həvəssizlik, könülsüzlük, meylsizlik; istəməmə, arzu etməmə, boyun qaçırma; **with ~** istəməyərək, meylsiz, istəməyə-istəməyə, həvəssiz, könülsüz, həvəssiz/ könülsüz olaraq; **to show ~ to do** *smth.* bir şey etməyə həvəssizlik göstərmək; **2.** *fiz.* maqnit müqaviməti

**reluctant** [rɪ'lʌktənt] *adj* könülsüz, həvəssiz, meylsiz; **~ helpers** həvəssiz köməkçilər; **to give a ~ promise** ürəksiz/ həvəssiz vəd vermək; *He was very reluctant to help O, kömək etməyə həvəs göstərmədi*; **an ~ answer** həvəssiz/ meylsiz/ könülsüz cavab

**reluctantly** [rɪ'lʌktəntlɪ] *adv* istəmədən, istəməyərək, meylsiz, həvəssiz/könülsüz olaraq, istəməyə-istəməyə; **to do** *smth.* **~** bir şeyi həvəssiz/könülsüz olaraq etmək; *They reluctantly agreed Onlar könülsüz (olaraq) razılaşdılar*

**rely** [rɪ'laɪ] *v* *(pt, pp* **relied)** arxalanmaq, güvənmək, bel bağlamaq, inanmaq, ümid olmaq/etmək; *You may rely on/upon me Sən/Siz mənə bel bağlaya bilərsən/ bilərsiniz*

**remain** [rɪ'meɪn] *v* qalmaq; **to ~ at home** evdə qalmaq; **to ~ behind** arxada qalmaq; *He remained in town for two days O, iki gün şəhərdə qaldı*; *If you take 3 from 8,5 remains Əgər 8-dən 3 çıxılsa, 5 qalacaq*; *Let it remain as it is Qoy necə varsa, elə də qalsın*; **to ~ silent** sakit qalmaq; **to ~ faithful to** *smb.* bir kəsə sadiq qalmaq; **to ~ in force for fifty years** əlli il qüvvədə qalmaq

**remainder**[1] [rɪ'meɪndəʳ] *n* **1.** *(adət.* **the remainder)** qalıq, qalanlar; *He kept a few of his books but gave the remainder O, kitablarının az bir hissəsini saxladı, qalanlarını verdi*; *Twenty people came in and the remainder stayed outside İyirmi nəfər adam içəri gəldi, qalanları bayırda qaldı*; **2.** qalan hissə; *The remainder of his life he spent in his native country O, ömrünün qalan hissəsini doğma kəndində keçirdi*; **3.** kitabın satılmayan nüsxələri/ hissəsi

**remainder**[2] [rɪ'meɪndəʳ] *v (xüs. məchul növdə işlədilir)* kitabın qalığını ucuz qiymətə satmaq

**remains** [rɪ'meɪnz] *n* **1.** qalıq, artıq; **the ~ of a meal** yemək qalığı, süfrədə qalan artıq; **2.** xarabа, xarabalıq, xarabazarlıq, viranəlik; **the ~ of ancient Rome** qədim Romanın xarabalığı/xarabazarlığı; **3.** meyit, cənazə

**remake**[1] ['ri:'meɪk] *n* **1.** dəyişdirmə, təzədən qayırma; yenidən işlənmə *(əsər və s.)*, düzəltmə; **2.** yenidən çəkilmiş film

**remake**[2] [.ri:'meɪk] *v* *(pt, pp* **remade** [-meɪd]) düzəltmək, təzədən qayırmaq; dəyişdirmək

**remark**[1] [rɪ'ma:k] *n* **1.** qeyd; fikir, rəy, mülahizə; məzəmmət; **to make/to pass a ~** mülahizə/fikir söyləmək; **2.** haşiyə, qeyd, sitat gətirmə, əsaslanma, sitat; **3.** müşahidə etmə; **things worthy of ~** müşahidəyə layiq şeylər

**remark**[2] [rɪ'ma:k] *v* **1.** görmək, müşahidə etmək, sezmək; *Did you remark the similarity between them? Sən/Siz onlar arasındakı fərqi sezdinmi?/sezdinizmi?*; **2.** qeyd etmək, fikir söyləmək; **to ~ on/upon** *smth.* bir şey haqqında fikir/rəy söyləmək

**remarkable** [rɪ'ma:kəbl] *adj* **1.** təəccüblü, qəribə; çox gözəl/yaxşı/qəşəng; **a ~ resemblance** təəccüblü oxşayış; **a ~ event** qəribə hadisə; **a ~ book** çox gözəl kitab; **2.** qeyri-adi; **a man ~ for his courage** qeyri-adi cəsur adam

**remarkably** [rɪ'ma:kəblɪ] *adv* olduqca, son dərəcə, fövqəladə, çox gözəl/qəşəng/ yaxşı; *She's remarkably tall for her age O, yaşına görə olduqca hündürdür*

**remarriage** [.ri:'mærɪdʒ] *n* yenidən evlənmə

**remarry** [.ri:'mærɪ] *v* *(pt, pp* **-ried)** yenidən /ikinci dəfə evlənmək; *The widower did not remarry Dul kişi ikinci dəfə evlənmədi*; *He remarried her former wife ten years after their divorce O, on il sonra boşadığı arvadı ilə yenidən evləndi*

**remediable** [rɪ'mi:dɪəbl] *adj* **1.** düzəldilə bilən; **2.** müalicə oluna bilən

**remedial** [rɪ'mi:djəl] *adj* **1.** islahedici, düzəldici; **~ lessons** islahedici dərslər *(geri qalan şagirdlər üçün)*; **2.** tibbi; müalicə/müalicəvi; **~ treatment for a bad back** ağrıyan bel üçün müalicə; **~ gymnastics** müalicə gimnastikası, müalicəvi gimnastika

**remedy**[1] ['remədɪ] *n* **1.** dərman; müalicə vasitəsi; **a good ~ for a cold** soyuqdəymə üçün yaxşı müalicə vasitəsi/ dərmanı; **~ for flu/toothache** zökəm/ dişağrısı üçün dərman; *Alcohol is the best remedy for cold Soyuqdəymənin ən yaxşı müalicə vasitəsi/dərman spirtli içkidir*; **2.** vasitə, tədbir *(bir şeyə qarşı)*; **to seek a ~ for injustice** ədalətsizliyə qarşı tədbir axtarmaq

**remedy**[2] ['remədɪ] *v* *(pt, pp* **-died)** **1.** sağaltmaq; **2.** düzəltmək; **to ~ a mistake** səhvi düzəltmək; *The situation could not be remedied Vəziyyət düzəldilə bilmədi*

**remember** [rɪ'membəʳ] *v (Davamedici zaman formalarında işlənmir)* **1.** xatırlamaq; yadda saxlamaq; *I shall always remember that terrible day*

*Mən o dəhşətli günü həmişə xatırlayacam; I don't remember his name Mən onun adını xatırlamıram*; 2. salam yetirmək; *Remember me to your father Məndən atana/atanıza salam yetir /yetirin*

**remembrance** [rɪˈmembrəns] *n* 1. xatirə; **in ~ of** ***smb.*** bir kəsin xatirəsinə; 2. huş, yaddaş; *It has escaped my remembrance O mənim huşumdan çıxıb*; 3. yada salma, xatirə; **obscure ~s** dumanlı xatirələr; 4. *pl* salam; *Give my kind remembrances to him Mənim atəşin salamlarımı ona yetir/yetirin*

**remilitarization** [ˈriː.mɪlɪtəraɪˈzeɪʃn] *n* yenidən hərbiləşdirmə/hərbiləşdirilmə

**remilitarize, -ise** [ˈriːˈmɪlɪtəraɪz] *v* yenidən hərbiləşdirmək, yenidən ordu/hərbi sənaye yaratmaq

**remind** [rɪˈmaɪnd] *v* yada salmaq, xatırlamaq, xatırlatmaq; **to ~ *smb.* of *smth.*** bir kəsə bir şeyi xatırlatmaq, bir şeyi bir kəsin yadına salmaq; *He reminds me of his brother O mənə qardaşını xatırladır; Remind me to answer these letters Bu məktublara cavab verməyi mənim yadıma sal/salın*

**reminder** [rɪˈmaɪndə$^{r}$] *n* xatırlama, yada salma; *The sudden cold weather served as a reminder that winter was not yet over Qəfil soyuq hava qışın hələ də qurtarmadığını xatırlatdı*

**reminisce** [.remɪˈnɪs] *v d.d.* yada salmaq, xatırlamaq; *She often reminisced about her youth O tez-tez gəncliyini xatırlayırdı /yada salırdı*

**reminiscence** [.remɪˈnɪsns] *n* 1. yada salma; xatirə; **~s of childhood** uşaqlıq xatirələri; 2. xatirat, xatirələr, memuar; **to write ~s** memuar yazmaq

**reminiscent** [.remɪˈnɪsnt] *adj* **(of)** xatırladan; yada salan, bənzəyən; *His style is faintly reminiscent Picasso's Onun üslubu bir az Pikassonun üslubunu xatırladır*

**remiss** [rɪˈmɪs] *adj* 1. başısoyuq; diqqətsiz, huşsuz, etinasız, saymaz; **to be ~ in *one's* duties** öz vəzifəsinə başısoyuq/ diqqətsiz/etinasız olmaq; 2. zəif, süst, ölüvay, ətalətli, ləng, ağırtərpənən

**remissible** [rɪˈmɪsəbl] *adj* üzrlü, bağışlana bilən, bağışlanası, keçiləsi, mümkün olan, yol verilə bilən

**remission** [rɪˈmɪʃn] *n* 1. bağışlama, bağışlanma; günahından/təqsirindən keçmə; **to grant *smb.* ~ of sins** bir kəsin günahlarını bağışlamaq; 2. azad etmə/edilmə *(cərimədən, vergidən və s.)*: **to grant *smb.* a ~ of taxation** bir kəsi vergidən azad etmək; 3. zəifləmə, zəifləmə *(soyuq, isti və s. haq.)*; 4. *hüq.* hüquqdan və s. imtina etmək/ əl çəkmək; **the ~ of a claim** iddiadan imtina etmə/əl çəkmə

**remit** [rɪˈmɪt] *v* (-tt-) 1. bağışlamaq *(günahı)*; 2. azad etmək *(vergidən, cərimədən və s.)*; *The taxes have been remitted Vergilər götürülüb*; 3. azaltmaq, zəiflətmək; cilovlamaq; **to ~ *one's* anger** acığını/hirsini cilovlamaq; 4. azalmaq; kəsmək; dayanmaq; *The pain has remitted Ağrı azalıb/kəsib/dayanıb; The storm has remitted Tufan azalıb/kəsib*; 5. göndərmək, yollamaq *(pul)*; *He remits home every month O hər ay evə pul göndərir*; 6. *hüq.* başqa instansiyaya göndərmək *(işi)*; *The case has been remitted for rehearing before another judge İşə başqa hakimin baxması üçün digər instansiyaya göndərilib*

**remittance** [rɪˈmɪtns] *n* 1. göndərmə; pul köçürmə; 2. köçürülən pul, pul köçürülməsi

**remnant** [ˈremnənt] *n* 1. qalıq; **the ~s of a meal** xörəyin qalıqları; 2. iz; **~s of former glory** əvvəlki şöhrətin izləri

**remodel** [.riːˈmɔdl] *v* (-ll-) 1. yenidən düzəltmək, dəyişdirmək; **to ~ a dress** paltarı düzəltmək /söküb yenidən tikmək; 2. yenidən qurmaq/təşkil etmək; **to ~ the education system** təhsil sistemini yenidən təşkil etmək; *The inside of the old house was completely remodelled Köhnə evin içi tamamilə yenidən qurulmuşdu/dəyişdirilmişdi*

**remonstrance** [rɪˈmɔnstrəns] *n* protest, qəti etiraz; *Our remonstrance produced no effect Bizim qəti etirazımız heç bir effekt vermədi*

**remonstrate** [rɪˈmɔnstreɪt] *v* **(against)** protest/qəti etiraz etmək; **to ~ against cruelty** qəddarlığa qarşı qəti etiraz etmək

**remorse** [rɪˈmɔːs] *n* vicdan əzabı; peşmançılıq; **biting ~** dözülməz vicdan əzabı; **to feel ~** vicdan əzabı/peşmançılıq çəkmək; *He filled with remorse for not having vizited his dying father Ölməkdə olan atasına baş çəkmədiyi üçün o, vicdan əzabı çəkirdi; The prisoner showed no remorse for his crime Dustaq cinayəti üçün heç bir peşmançılıq nümayiş etdirmədi*

**remorseful** [rɪˈmɔːsfl] *adj* çox peşman; *He looked remorseful O çox peşman görünürdü*

**remorsefully** [rɪˈmɔːsfəlɪ] *adv* peşmancasına, peşman olmuş kimi, peşmançılıqla, peşman-peşman

**remorseless** [rɪˈmɔːslɪs] *adj* insafsız, amansız, rəhmsiz, zalım, daşürəkli, qəddar; **a ~ struggle** amansız mübarizə

**remote** [rɪˈmout] *adj* (-r, -st) 1. uzaq; **a ~ village/country** uzaq kənd/ölkə; **a town ~ from the sea** dənizdən uzaq şəhər; **~ past** uzaq keçmiş; 2. uzaq *(qohum haq.)*; **a ~ kinsman** uzaq qohum; 3. əlaqəsi olmayan; **a question ~ from the subject** mövzu ilə əlaqəsi olmayan məsələ; 4. fərqli, oxşamayan, oxşarı olmayan; 5. zəif; **a ~ resemblance** zəif oxşayış/ bənzəyiş; 6. ağlabatmayan, gümana gəlməyən, şübhəli; **a ~ chance** ağlabatmayan imkan

**remote-controlled** [rɪˈmoutkənˈtrould] *adj tex.* uzaqdan idarə olunan; **a ~ handset** uzaqdan idarə edən pult *(məs. televizoru yandırmaq, kanalları dəyişmək və söndürmək üçün cihaz)*; **to press the ~ handset** pultu basmaq



**remoteness** [rɪˈmoutnɪs] *n* uzaqlıq; **the ~ of the mountains** dağların uzaqlığı

**remount[1]** [.riːˈmaunt] *n* ehtiyatda olan at

**remount[2]** [.riːˈmaunt] *v* 1. yenidən minmək *(ata, velosipedə və s.)*; yenidən minməyə kömək etmək *(ata, velosipedə və s.)*; 2. yenidən quraşdırmaq/montaj etmək; 3. *k.t.* sürünü artırmaq

**removable** [rɪˈmuːvəbl] *adj* 1. yerindən tərpədilə bilən, mütəhərrik; çıxarılan, çıxarıla bilən, çıxarılıb taxılan; **~ cushion covers** çıxarılıb taxıla bilən divan balışının örtüyü/üzü; 2. dəf edilə/aradan qaldırıla bilən; **~ evil** aradan qaldırıla bilən şər/bəla; 3. *tex.* dəyişilə bilən; **~ parts** dəyişilə bilən hissələr *(maşında və s.)*

**removal** [rɪˈmuːvl] *n* 1. daşıma, daşınma; köçmə; **~ of furniture** mebeli daşıma *(yeni mənzilə)*; **~ of load** yükü daşıma; **~ into a house** (yeni) evə daşınma; 2. vəzifədən çıxartma; **the ~ of an official** məmuru vəzifədən çıxartma; **~ from appointment** *hərb.* vəzifədən çıxartma; 3. aradan qaldırma/qaldırılma; **~ of dissatisfaction** narazılığı aradan qaldırma; 4. *hüq.* işi göndərmə *(bir instansiyadan başqasına)*; 5. *tib.* çəkmə, buraxma *(mayeni)*

**remove[1]** [rɪˈmuːv] *n* 1. pillə, addım; aralıq; **at a certain ~** müəyyən aralıqda; **at many ~s** uzaq məsafədə; 2. qohumluq dərəcəsi; **a second cousin at one ~** əminəvəsinin /dayınəvəsinin /bibinəvəsinin oğlu və ya qızı; 3. şagirdin növbəti sinfə keçirilməsi; *He didn't get his remove O, sinifdə qaldı*; 4. sinif *(bəzi ingilis məktəblərində)*; *He was placed in my remove Onu mənim sinfimə keçirdilər*

**remove[2]** [rɪˈmuːv] *v* 1. çəkmək, yerini dəyişdirmək, yerindən tərpətmək, başqa yerə köçürtmək; *The paintings were removed to a museum Şəkilləri muzeyə köçürdülər/apardılar*; 2. götürmək, yığışdırmaq; **to ~ the dishes from the table** qabları stoldan götürmək/yığışdırmaq; **to ~ *one's* hand from *smb.'s* shoulder** əlini bir kəsin çiynindən götürmək; 3. soyunmaq, çıxartmaq *(paltarı)*; **to ~ *one's* hat/coat /gloves/glasses** papağını / paltosunu/ əlcəyini/eynəyini çıxartmaq; 4. açmaq *(sarğı)*; **to ~ bandages from *smb.'s* arm** bir kəsin qolundan sarğı açmaq; 5. aparmaq *(ləkəni)*; **to ~ grease stains** yağ ləkələrini aparmaq; 6. aradan götürmək, dəf etmək; **to ~ obstacles** maneələri aradan qaldırmaq/dəf etmək; 7. köçmək, mənzili dəyişmək; **to ~ into the country** kəndə köçmək;

◊ **to ~ mountains** dağı yerindən tərpətmək; dağı dağ üstə qoymaq

**removed** [rɪˈmuːvd] *adj* 1. uzaqlaşdırılmış, kənar edilmiş; uzaq; **an era a hundred years ~** bizdən yüz il uzaq dövr; *He is only one step removed from a swindler O, dələduzdan çox az fərqlənir; His feelings are not removed from love O, demək olar ki, aşiq olub/vurulub*; 2. fərqli, əlaqəsi olmayan, rabitəsiz, dolaşıq, bir-birini tutmayan; **a tongue equally ~ from French and English** fransız və eləcə də ingilis dilindən fərqli dil

**remover** [rɪˈmuːvə$^{r}$] *n* 1. mebel daşıyan; 2. ləkəaparan *(maye və s.)*

**remunerate** [rɪˈmjuːnəreɪt] *v* mükafatlandırmaq, mükafat vermək; ödəmək, haqqını/muzdunu /əvəzini ödəmək; **to ~ *smb.* for his trouble** narahatlığa görə bir kəsə təşəkkür etmək; *His efforts were remunerated Səylərinə görə onu mükafatlandırdılar/ona mükafat verdilər*

**remuneration** [rɪ.mjuːnəˈreɪʃn] *n* mükafat, mükafat vermə; haqq, əvəz, muzd; *The author would accept no remuneration at all Müəllif əsla/qətiyyən haqq/muzd almayacaq*

**remunerative** [rɪˈmjuːnərətɪv] *adj* mənfəətli, gəlirli; **a highly ~ job/post** yüksək gəlirli iş/vəzifə

**renaissance** [rɪˈneɪsns] *n* 1. renessans, intibah; 2. **the Renaissance** Renessans/ İntibah dövrü *(XV-XVI əsrlərdə Avropada elm və incəsənətin çiçəklənməsi dövrü)*

**renal** [riːnl] *adj tib.* böyrək; **~ calculus** *tib.* böyrək daşı; **~ tissues** böyrək toxumaları

**rename** [.riːˈneɪm] *v* yeni ad vermək, adını dəyişdirmək; **to ~ a street/a town** küçənin/şəhərin adını dəyişdirmək; *Ganja was renamed several times in its history Gəncənin adı tarixində dəfələrlə dəyişdirilmişdi*

**renascent** [rɪˈnæsnt] *adj* canlanan, fəallaşan; baş qaldıran, oyanan; **~ nationalism** canlanan millətçilik; *He felt a renascent love for his children O, uşaqlarına qarşı yeni məhəbbət oyandığını hiss etdi*

**rend** [rend] *v (pt, pp* **rent)** 1. qopartmaq; ayırmaq, ayrı salmaq, zorla almaq; *The child was rent from its mother's arms Uşağı anasının əlindən/qucağından zorla aldılar*; 2. *arx. şair.* cırmaq; **to ~ *one's* clothes** paltarını cırmaq; 3. *(həm də məc.)* parçalamaq; *The country was rent in two by civil war Vətəndaş müharibəsi ölkəni ikiyə/iki hissəyə parçaladı; It rends my heart Bu mənim ürəyimi parçalayır; The clouds seemed rent asunder by flashes of lightning Şimşəyin parıltısı sanki buludları parçaladı*

**render[1]** [ˈrendə$^{r}$] *n* 1. haqqını ödəmə/vermə, ödəniş, ödəmə; haqq, muzd; **payments in money and ~s in kind** pulla və natura ilə ödəmə/ödəniş; 2. *tik.* suvağın birinci qatı

**render[2]** [ˈrendə$^{r}$] *v* 1. vermək, əvəzini/haqqını vermək; ödəmək, haqqını ödəmək; **to ~ a tribute** bac/xərac vermək; 2. cavab vermək; **to ~ a blow for blow** zərbəyə zərbə ilə cavab vermək; **to ~ good for evil** şərə xeyirlə/yamanlığa

yaxşılıqla cavab vermək; 3. təqdim etmək; **to ~ an account to** ***smb.*** bir kəsə hesabat vermək/təqdim etmək; **to ~ an account of** ***smth.*** bir şey haqqında hesabat vermək/təqdim etmək; 4. qurban vermək; **to ~** ***one's*** **life for** ***one's*** **country** həyatını vətəninə qurban vermək; 5. göstərmək *(kömək, xidmət və s.)*; **to ~ help/service** kömək/xidmət göstərmək; 6. yetirmək *(diqqət və s.)*; **to ~ attention** diqqət yetirmək; 7. ifa etmək *(əsəri və s.)*; *The piano solo was well rendered Solo pianoda yaxşı ifa edildi*; 8. tərcümə etmək; **to ~ an English words into Azerbaijani Turkish** ingilis sözlərini Azərbaycan türkcəsinə tərcümə etmək; *The document was rendered into several languages Sənəd bir neçə dilə tərcümə edildi*; 9. çıxarmaq, çıxartmaq *(qərar və s.)*; **to ~ a decision** qərar çıxartmaq; 10. *tik.* suvamaq, suvaq vurmaq/çəkmək; *The builders were rendering the walls İnşaatçılar divarları suvaqlayırdılar/divarlara suvaq çəkirdilər/vururdular*; 11. müəyyən vəziyyətə salmaq; **to ~ helpless** aciz /əlacsız vəziyyətə salmaq; **to ~ unnecessary** lazımsız vəziyyətə salmaq; *Heat renders me helpless İsti məni süstləşdirir/halsız edir*; **to be ~ed speechless with rage** qeyzdən/hirsdən nitqini itirmək; **to ~ active** fəallaşdırmaq

**rendering** [ˈrendərɪŋ] *n* 1. ifa etmə; *The rendering of the cantata was excellent Kantata əla ifa edildi/olundu*; 2. tərcümə; *This translation fails to give a correct rendering of the original Bu tərcümə orijinala müvafiq gəlmir*; 3. göstərmə *(xidmət, kömək və s.)*; **~ of help** kömək göstərmə; 4. *tik.* suvaq; suvama, suvaq çəkmə; suvağın birinci qatı

**rendezvous**[1] [ˈrɔndɪvu:] *n fr.* *(pl* **-vous** [-vu:z]) 1. görüş; **a secret ~** gizli görüş; *Let's make a rendezvous – Where and when can we meet? Gəl/Gəlin görüş təyin edək – Harada və nə vaxt görüşə bilərik?*; 2. görüş yeri; *This club is a rendezvous for writers Bu klub yazıçıların/yazarların görüş yeridir*

**rendezvous**[2] [ˈrɔndɪvu:] *v* *(pt, pp* **-voused** [-vu:zd]) 1. görüşmək, görüş yerinə gəlmək; toplaşmaq, yığışmaq; *The refugees rendezvoused in the valley Qaçqınlar dərədə toplaşdılar/dərəyə yığışdılar*; 2. *amer. hərb.* görüş yerinə ordu və ya gəmi toplamaq

**rendition** [renˈdɪʃn] *n* 1. ifa, ifa etmə *(rolu)*; **their ~ of Hamlet** onların Hamlet rolunu ifa etmələri; 2. *amer.* tərcümə; **the ~ of the book into English** kitabın ingilis dilinə tərcüməsi; 3. *hüq.* qaçmış cinayətkarı xarici dövlətə vermə

**renegade**[1] [ˈrenɪgeɪd] *n* xain, dönük, xəyanətkar, satqın, fərari; **bands of ~s in the mountains** dağlarda xəyanətkarların/ satqınların dəstələri

**renegade**[2] [ˈrenɪgeɪd] *adj* xain, dönük, satqın; **a ~ priest/spy/soldier** satqın keşiş/ casus/əsgər

**renegade**[3] [ˈrenɪgeɪd] *v* xain/satqın/dönük olmaq; xainlik/satqınlıq/dönüklük etmək

**renegation** [ˌrenɪˈgeɪʃn] *n* xainlik, satqınlıq, dönüklük

**renege** [rɪˈni:g, rɪˈneɪg] *v* sözünün üstündə durmamaq, vədindən qaçmaq, dönüklük/ vəfasızlıq etmək

**renew** [rɪˈnju:] *v* 1. təzələmək, yeniləşdirmək, dəyişdirmək; **to ~ a passport/contract** pasportu/müqaviləni təzələmək; *A snake renews its skin İlan qabığını dəyişdirir*; **to ~** ***one's*** **library ticket** kitabxana biletini dəyişdirmək; **to ~ a friendship/a relationship/an acquaintance** dostluğu/əlaqəni/tanışlığı təzələmək; 2. artırmaq, doldurmaq *(ehtiyatı və s.)*; *We must renew our supplies of coal Biz kömür ehtiyatımızı artırmalıyıq*; 3. yenidən başlamaq; bərpa etmək; **to ~ an attack** yenidən hücuma keçmək; **to ~** ***one's*** **acquaintance/*****one's*** **friendship with** ***smb.*** bir kəslə tanışlığını /dostluğunu bərpa etmək; 4. təkrar etmək, təkrar lamaq; **to ~ vows/a promise/objections** andını/vədini/etirazını təkrar etmək

**renewal** [rɪˈnju:əl] *n* 1. təzələmə, yeniləşdirmə, yeniləşmə, təzələnmə; bərpa etmə/edilmə; **~ of an old friendship** köhnə dostluğu bərpa etmə/ təzələmə; 2. doldurma, artırma *(ehtiyatı)*; 3. *tex.* bərpa təmiri, çox işlənib köhnəlmiş avadanlığı/ləvazimatı dəyişdirmə; 4. yenidən başlama; **~ of hostilities** hərbi əməliyyatları yenidən başlama; *Any renewal of negotiations will be welcomed Danışıqların hər hansı formada yenidən başlanması alqışlanacaq*; 5. təkrar etmə; **~ of a promise** vədi təkrar etmə

**renewed** [rɪˈnju:d] *adj* 1. yeni, təzə; **to act with ~ energy** yeni səylə/qətiyyətlə hərəkət etmək; 2. təzələnmiş, yenidən başlanmış, bərpa edilmiş; canlanmış, dirçəlmiş; 3. görülmüş, edilmiş

**rennet** [ˈrenɪt] *n* I *bot.* ranet *(alma növü)*

**rennet** [ˈrenɪt] *n* II maya *(pendir tutmaq üçün)*

**renounce** [rɪˈnauns] *v* 1. imtina etmək, əl götürmək/çəkmək; boyun qaçırmaq; **to ~ a title/a property** tituldan/əmlakdan imtina etmək; **to ~ all claims** bütün iddialardan imtina etmək/əl götürmək/əl çəkmək; **to ~ an idea** fikirdən/ideyadan imtina etmək/əl çəkmək; **to ~ a treaty** müqavilədən imtina etmək; 2. qəbul etməmək, rədd etmək; **to ~** ***smb.'s*** **authority** bir kəsin avtoritetini/nüfuzunu qəbul etməmək; 3. danmaq, dönmək, üz döndərmək; **to ~ a son** oğuldan üz döndərmək, oğulu danmaq

**renouncement** [rɪˈnaunsmənt] *n* imtina, imtina etmə, üz döndərmə, əl çəkmə; **~ of succession** irsdən/varislikdən imtina etmə

**renovate** [ˈrenəveɪt] *v* 1. təzələmək, bərpa etmək; təmir etmək; *The house has been completely renovated and modernized Ev tamamilə yenidən təmir edilmiş və müasirləşdirilmişdir*;



2. təzələmək, yeniləşdirmək; **to ~ the world** dünyanı yeniləşdirmək/təzələmək; 3. təzələnmək, yeniləşdirilmək; təmir/bərpa edilmək

**renovation** [ˌrenouˈveɪʃn] *n* 1. bərpa, bərpa etmə, əvvəlki halına salma; **buildings in need of ~** bərpa edilməyə ehtiyacı olan binalar/tikililər; *The college is closed for renovation Kollec təmir/bərpa edilmək üçün bağlanıb*; 2. yeniləşmə, təzələnmə; **~ of soul** mənəvi təzələnmə

**renown** [rɪˈnaun] *n* şərəf, şöhrət, şan; ad, san; məşhurluq; **of ~** məşhur, adlı-sanlı, tanınmış; **a man of great/of high ~** çox məşhur/şöhrətli/tanınmış adam

**renowned** [rɪˈnaund] *adj* tanınmış, ad/şöhrət qazanmış; **~ as an actress** aktrisa kimi tanınmış/ad-san qazanmış; *Edisson was renowned as an inventor Edison ixtiraçı kimi ad-san qazandı*

**rent**[1] [rent] *n* I 1. mənzil kirayəsi, icarə haqqı; **heavy ~** yüksək ev kirayəsi; **for ~** kirayəyə, kirayə üçün; **to owe three months' ~** üçaylıq mənzil kirayəsi borcu olmaq; 2. *siya. iq.* renta *(sahibkarların mülkdən və ya torpaqdan müntəzəm surətdə əldə etdiyi gəlir)*; **a ~ in kind** natural renta; **to pay the ~ monthly** rentanı aylıq vermək

**rent** [rent] *n* II deşik, dəlik; yarıq; **a ~ in the wall** divarda deşik/dəlik/yarıq

**rent**[2] [rent] *adj* cırılmış, deşilmiş, dəlinmiş; dəlik, deşik

**rent**[3] [rent] *v* 1. kirayəyə/icarəyə vermək; *Mr Brown has rented his land (out) to us at $5000 a year Cənab Braun torpağını bizə ildə 5000$ icarəyə verib*; 2. icarəyə götürmək; *Did he buy or rent his radio? O, radiosunu alıb yoxsa icarəyə götürüb?*

**rent**[4] [rent] **to rend** *felinin pt, pp formaları*

**rental** [ˈrentl] *n* 1. icarə haqqı, kirayə pulu; 2. icarədən/kirayədən gələn gəlir

**rent-collector** [ˈrentkəˌlektəʳ] *n* ev kirayəsi yığan

**renter** [ˈrentəʳ] *n* kirayəçi, kirayənişin, kirayə götürən; icarədar, icarəçi, icarəyə götürən

**rent-free** [ˈrentˈfri:] *adj* ev kirayəsindən/ icarə haqqından azad; **a ~ house** kirayə alınmayan /kirayə haqqından azad ev; **to occupy rooms ~** kirayə haqqı verməden otaqları tutmaq/otaqlarda yaşamaq

**renunciate** [rɪˈnʌnsɪeɪt] *v* razı olmamaq, istəməmək, razılıq verməmək, rədd etmək, boynuna götürməmək, boyun qaçırmaq, imtina etmək

**renunciation** [rɪˌnʌnsɪˈeɪʃn] *n* 1. imtina, imtina etmə; rədd etmə; üz döndərmə; əl çəkmə; **~ of** ***one's*** **ambitions** (özünün) şöhrətpərəst fikirlərindən/niyyətlərindən əl çəkmək; **a/the ~ of nuclear weapons** nüvə silahından imtina etmə; 2. varından-yoxundan keçmə, özünü hər şeydən məhrum etmə

**reoccupation** [ˈri:ˌɔkjuˈpeɪʃn] *n hərb.* təkrar ələ keçirmə/tutma *(ərazini və s.)*

**reoccupy** [ˈri:ˈɔkjupaɪ] *v* yenidən ələ keçirmək/tutmaq/istila etmək

**reopen** [ˌri:ˈoupn] *v* yenidən açmaq; **to ~ the shop under a new name** yeni ad altında mağazanı yenidən açmaq; **to ~ a discussion/debate** yenidən müzakirə/ mübahisə açmaq; *School/ Parliament reopens next week Məktəb/Parlament gələn həftə yenidən açılır*

**reorder**[1] [ˌri:ˈɔ:dəʳ] *n* təkrar sifariş

**reorder**[2] [ˌri:ˈɔdəʳ] *v* 1. sifarişi/əmri/ sərəncamı təkrar etmək; yeni sifariş/əmr/ sərəncam vermək; 2. yenidən sıraya düzmək/yerləşdirmək; **to ~ the books on the shelf** kitabları rəfdə yenidən düzmək/ yerləşdirmək; 3. yenidən planlaşdırmaq

**reorganization, -isation** [riˌɔ:gənaɪˈzeɪʃn] *n* yenidən təşkil etmə/edilmə, yenidən qurma/ qurulma

**reorganize, -ise** [rɪˈɔ:gənaɪz] *v* yenidən təşkil etmək/qurmaq

**repack** [ˈri:pæk] *v* yenidən/təzədən qablaşdırmaq

**repaid** [rɪˈpeɪd] **to repay** *felinin pt. pp formaları*

**repair**[1] [rɪˈpeəʳ] *n* 1. *(adət. pl)* təmir, təmir etmə; **under ~s** təmirdə; *My car is under repairs Mənim maşınım təmirdədir; The shop is closed for repairs Mağaza təmir üçün bağlanıb*; **to put** ***smth.*** **in ~** bir şeyi təmirə qoymaq; *The house needs putting in repair Evi təmirə qoymaq lazımdır*; 2. bərpa etmə; **the ~ of** ***one's*** **health** sağlamlığını bərpa etmə; 3. sağalma; **the ~ of a wound** yaranın sağalması; 4. yararlılıq; sazlıq; **in good/in bad ~** saz/nasaz vəziyyətdə; **to be out of ~** nasaz vəziyyətdə olmaq; *The bicycle is out of repair Velosiped sınıqdır/nasaz vəziyyətdədir*; **to keep in ~** saz vəziyyətdə saxlamaq

**repair**[2] [rɪˈpeəʳ] *adj* təmir; **a ~ shop** təmir emalatxanası; **~ parts** ehtiyat (təmir üçün) hissələr

**repair**[3] [rɪˈpeəʳ] *v* I 1. təmir etmək, qayırmaq; **to ~ a house/a road/a watch,** ***etc.*** ev/yol/saat *və s.* təmir etmək; 2. yamamaq; **to ~ clothes** paltarı yamamaq; 3. bərpa etmək; **to ~** ***one's*** **health** sağlamlığını bərpa etmək; 4. sağalmaq; *The wound was not repairing Yara sağalmırdı*; 5. düzəltmək; **to ~ a mistake** səhvi düzəltmək; 6. əvəzini vermək, ödəmək, yerini doldurmaq; **to ~ damages** zərəri/ziyanı ödəmək

**repair** [rɪˈpeəʳ] *v* II 1. yollanmaq, getmək, yola düşmək; **to ~ homeward** evə getmək/yollanmaq; *We all repaired to the nearest pub Biz hamımız lap yaxındakı pivəxanaya getdik/yollandıq*; 2. tez-tez baş çəkmək, gəlmək, getmək; *They repaired daily to the park Onlar hər gün parka gedirdilər*

**repairable** [rɪˈpeərəbl] *adj* təmir edilə bilən, düzəldilməsi mümkün olan; *This house isn't repairable Bu ev təmir edilə/oluna bilməz*

**repairer** [rɪˈpeərəʳ] *n* təmirçi, təmir ustası/fəhləsi; **a ~ of clocks** saatsaz

**reparable** [ˈrepərəbl] *adj* 1. düzəldilə/düzələ/islah edilə bilən; düzələn; ~ **mistake** düzəldilə bilən səhv; 2. təmir edilməli olan; **roads ~ by local authorities** yerli bələdiyyə hakimiyyətinin təmir etməli olan yolları

**reparation** [ˌrepəˈreɪʃn] *n* 1. kompensasiya, ödəmə, əvəz, qarşılıq; əvəzi verilmə, əvəzini vermə; ~ **of damages** ziyanların ödənilməsi; 2. düzəltmə, yüngülləşdirmə, yumşaltma *(günahı və s.)*; **to make ~ for a wrong** günahı yüngülləşdirmək

**repartee** [ˌrepaːˈtiː] *n* 1. ağıllı/zirək cavab; **to be good/quick at ~** hazırcavab olmaq; *He is not happy at repartee O, ağıllı cavab verə bilmir, O, hazırcavab deyil*; 2. hazırcavablıq, zirəklik, diribaşlıq

**repast** [rɪˈpaːst] *n* yemək, qida; **light ~** yüngül yemək; **spiritual ~** mənəvi qida

**repatriate**[1] [ˌriːˈpætrɪeɪt] *n* repatriant *(əsirlikdən, mühacirətdən və s. vətənə qayıtmış adam)*

**repatriate**[2] [ˌriːˈpætrɪeɪt] *v* 1. vətənə qaytarmaq; **to ~ refugees/prisoners of war** müharibə qaçqınlarını/əsirlərini vətənə qaytarmaq; 2. vətənə qayıtmaq

**repatriation** [ˈriːpætrɪˈeɪʃn] *n* repatriasiya, vətənə qayıtma/qaytarılma; **voluntary/forced ~** könüllü/məcburi repatriasiya

**repay** [rɪˈpeɪ] *v (pt, pp* **repaid** [rɪˈpeɪd]) 1. qaytarmaq *(borcu)*; **to ~ a debt/loan** borcu/istiqrazı qaytarmaq; 2. : **to ~ a visit** vizitə cavab vermək, cavab olaraq vizitə/ görüşə gəlmək; 3. ödəmək *(ziyanı)*, əvəzini ödəmək *(ziyanın)*; 4. əvəzini çıxmaq/çıxartmaq; əvəzini vermək; *I don't know how to repay him for his kindness Bilmirəm onun yaxşılığının əvəzini necə çıxım*; **to ~ evil with/by good, to ~ good for evil** yamanlığa yaxşılıqla cavab vermək

**repayable** [rɪˈpeɪəbl] *adj* ödənilməli, ödənilməli olan; *The debt is repayable at the end of the month Borc ayın axırında/ sonunda ödənilməlidir*

**repayment** [rɪˈpeɪmənt] *n* 1. ödəmə, geri qaytarma *(borcu)*; 2. mükafatlandırma; ~ **for help** köməyi mükafatlandırma

**rep** [rep] *n* = **representative**

**repeal**[1] [rɪˈpiːl] *n* ləğv etmə, ləğv; **the ~ of a law/decision** qanunu/qərarı ləğv etmə

**repeal**[2] [rɪˈpiːl] *v* ləğv etmək *(qanunu və s.)*

**repeat**[1] [rɪˈpiːt] *n* 1. təkrar, təkrar etmə; **the ~ of an order** sifarişi təkrar etmə; 2. radio və ya televiziya proqramını təkrar etmə/vermə; – *Is it a new series? – No, only repeats – Bu, təzə seriyadırmı? –Xeyr, sadəcə təkrardır*; 3. *mus*. repriz *(musiqi pyesinin əsas mövzusunun təkrar edilməsi və bu təkrarı bildirən not işarəsi)*; 4. geriyə yol; **to go one mile and ~** bir mil gedib, geri qayıtmaq

**repeat**[2] [rɪˈpiːt] *v* 1. təkrar etmək; **to ~ a mistake/a word** səhvi/sözü təkrar etmək; *He repeated several times that he was busy O bir neçə dəfə təkrar etdi ki, məşğuldur; Don't repeat what I told you Mənim dediyimi təkrar etmə/etməyin*; 2. əzbər demək, əzbərləmək; **to ~ *one's* lesson** dərsini əzbər demək/əzbərləmək; **to ~ a poem** şer əzbərləmək; 3. sirri danışmaq/açmaq/xəbər vermək *(bir kəsə)*; *He repeats everything to the master O hər şeyi müəllimə danışır/xəbər verir*; 4. *amer*. seçkidə qanunsuz olaraq bir neçə dəfə səs vermək

**repeated** [rɪˈpiːtɪd] *adj* təkrar, təkrar olunan; ~ **request/promise/demand/test** təkrar xahiş /vəd/tələb/test

**repeatedly** [rɪˈpiːtɪdlɪ] *adv* dəfələrlə, tez-tez, təkrarən, dübarə; **to say *smth*. ~** bir şeyi tez-tez/təkrarən demək; *He repeatedly fails to pass the examination O, imtahan verərkən dəfələrlə kəsilir*

**repeater** [rɪˈpiːtəʳ] *n* 1. *amer. d.d.* iki il bir sinifdə qalan tələbə; 2 *amer*. seçkidə qanunsuz olaraq səs verən; 3. *riyaz*. dövri kəsr

**repel** [rɪˈpel] *v* 1. qovmaq; dəf etmək, geri oturtmaq; **to ~ an attack** hücumu dəf etmək; **to ~ an enemy** düşməni geri oturtmaq/qovmaq; **to ~ temptation** nəfsi/tamahı dəf etmək/saxlamaq; 2. rədd etmək; **to ~ an offer** təklifi rədd etmək; **to ~ an accusation** ittihamı rədd etmək; **to ~ a plea** ittihamı/tələbi rədd etmək; 3. nifrət/ədavət/düşmənçilik oyatmaq; *His manners repel me Onun davranışı məndə nifrət/ədavət oyadır*; 4. qatışmamaq; *Water repels oil Su yağla qarışmır/ qatışmır*

**repellent**[1] [rɪˈpelənt] *n* 1. həşəratları qovan kimyəvi maddə; **mosquito ~** ağcaqanadları qovan kimyəvi maddə; 2. su keçirməyən/buraxmayan parça; 3. ikrahdoğuran şey

**repellent**[2] [rɪˈpelənt] *adj* 1. iyrənc, mənfur; ikrahoyadan, ikrahdoğuran; ~ **smell/ food/manners** ikrahdoğuran iy/yemək/ davranışlar; 2. itələyən, itələyici; ~ **force** itələyici qüvvə; 3. su keçirməyən/ buraxmayan; ~ **stuffs** su keçirməyən/ buraxmayan materiallar

**repent**[1] [ˈriːpənt] *adj* 1. *bot*. sürünən; ~ **plants** sürünən bitkilər; 2. *zool*. sürünən; ~ **animals** sürünən heyvanlar

**repent**[1] [rɪˈpent] *v* peşman olmaq, tövbə etmək, peşmançılıq çəkmək, təəssüf etmək; heyfsilənmək; **to ~ (of) *smth*.** bir şeydən peşman olmaq, bir şeyə heyfsilənmək; *He soon repented his actions O tezliklə hərəkətlərindən peşman oldu/peşmançılıq çəkdi; Repent of your sins and ask God's forgiveness Hərəkətlərinə/Hərəkətlərinizə görə tövbə et/edin və Allahdan bağışlanmanı/ bağışlanmanızı rica et/edin; He has nothing to repent of Onun peşmançılıq çəkəcək heç nəyi/bir şeyi yoxdur; You shall repent this/of this Sən/Siz bundan peşman olacaqsan/ olacaqsınız*

**repentance** [rɪˈpentns] *n* peşmançılıq, peşman olma, peşmançılıq çəkmə; tövbə, tövbə etmə, heyfsilənmə; **to show ~** peşmançılıq çəkmək/tövbə etmək; **to show no sign of ~** əsla peşmançılıq çəkməmək/tövbə etməmək/ heyfsilənməmək



**repentant** [rɪˈpentnt] *adj* 1. peşman olan, peşmançılıq çəkən, tövbə edən; heyfsilənən; ~ **of/for their sins** günahlarından tövbə edən/peşman olan; 2. peşmançılıq/tövbə bildirən; ~ **tears** peşmançılıq bildirən göz yaşları; **her ~ face** onun peşmançılıq ifadə edən sifəti

**repercussion** [ˌriːpəˈkʌʃn] *n* 1. təkan; təpmə; qaytarma *(zərbədən və s. sonra)*; *The earthquake was followed by repercussion through the whole island Zəlzələnin təkanı bütün ada boyu hiss edildi/olundu*; 2. əks-səda; **the social/political ~s of the case** məsələnin ictimai/siyasi əks-sədası; 3. təsir, nəticə; *The conflict had many repercussions Münaqişənin bir çox nəticəsi oldu; His resignation will have serious repercussions on/for the firm Onun işdən getməsi firma üçün ciddi nəticələr verəcək*

**repertoire** [ˈrepətwaːʳ] *n* 1. *fr*. repertuar *(teatrda tamaşaya qoyulan əsərlərin məcmusu)*; **to have a wide ~** geniş repertuarı olmaq; **to add to *one's* ~** repertuarına əlavə etmək; **to extend *one's* ~** repertuarını genişləndirmək; 2. bacarıq; **the developing verbal ~ of young children** azyaşlı uşaqların nitq bacarığını inkişaf etdirmə

**repertory** [ˈrepətrɪ] *n* 1. anbar, saxlanc yeri; **a ~ of useful information** faydalı məlumatların saxlanıldığı yer, faydalı məlumatlar ehtiyatı; 2. = **repertoire**

**repetition** [ˌrepɪˈtɪʃn] *n* 1. təkrar; **the ~ of a feat/of a word** qəhrəmanlığın/sözün təkrarı; *His speech was full of repetition(s) Onun nitqi təkrar(lar)la dolu idi*; 2. əzbərdən təkrar etmə, əzbər öyrənmə

**repetitious** [ˌrepɪˈtɪʃəs] *adj* darıxdırıcı, usandırıcı, ürəksıxan, maraqsız; **a ~ speech** darıxdırıcı/usandırıcı/maraqsız nitq; **a ~ work** bıkdırıcı/usandırıcı iş

**repetitiously** [ˌrepɪˈtɪʃəslɪ] *adv* = **repetitively**

**repetitiousness** [ˌrepəˈtɪʃəsnɪs] *n* = **repetitiveness**

**repetitive** [rɪˈpetɪtɪv] *adj* maraqsız, bıkdırıcı, cansıxıcı, ürəksıxan, usandırıcı, darıxdırıcı; **a ~ job** maraqsız/usandırıcı/ darıxdırıcı iş; ~ **questions** maraqsız suallar

**repetitively** [rɪˈpetɪtɪvlɪ] *adv* darıxdırıcı, maraqsız, ürəksıxıcı, cansıxıcı; darıxdırıcı/ürəksıxıcı/usandırıcı bir tərzdə

**repetitiveness** [rɪˈpetɪtɪvnɪs] *n* maraqsızlıq, usandırıcılıq, darıxdırıcılıq, bıkdırıcılıq

**rephrase** [rɪˈfreɪz] *v* başqa sözlərlə ifadə etmək; **to ~ a question** məsələni başqa sözlərlə ifadə etmək

**repine** [rɪˈpaɪn] *v* şikayətlənmək, şikayət/ narazılıq etmək; **to ~ at *smth./smb*.** bir şeydən/kəsdən narazılıq etmək; **to ~ at *one's* unhappy lot** öz uğursuz taleyindən şikayətlənmək/şikayət etmək

**replace** [rɪˈpleɪs] *v* 1. (əvvəlki) yerinə qoymaq; **to ~ the receiver** dəstəyi yerinə qoymaq; 2. qaytarmaq; geri qaytarmaq; **to ~ the borrowed money** borc alınmış pulu geri qaytarmaq; 3. əvəzini vermək, yerini doldurmaq; **to ~ attrition** itkinin yerini doldurmaq/əvəzini vermək; 4. əvəz etmək, dəyişmək; **to ~ coal by/with oil fuel** kömürü duru yanacaqla əvəz etmək; **to ~ a tyre** təkəri əvəz etmək/ dəyişmək

**replaceable** [rɪˈpleɪsəbl] *adj* 1. dəyişdirilə/ əvəz edilə bilən; 2. çıxarıla bilən, çıxarılıb taxıla bilən

**replacement** [rɪˈpleɪsmənt] *n* əvəzləmə, əvəz etmə, dəyişdirmə; əvəz; **the ~ of worn parts** işlənib köhnəlmiş/əldən düşmüş hissəni dəyişdirmə

**replay**[1] [ˈriːpleɪ] *n* 1. *id*. təkrar oyun; 2. təkrar göstərmə, təkrar etmə *(lentə yazılmış bir şeyi)*

**replay**[2] [ˌriːˈpleɪ] *v* *id*. yenidən oynamaq *(heç-heçə qurtaran oyunu)*, təkrar oyun keçirmək *(heç-heçə qurtaran oyun haq.)*

**replenish** [rɪˈplenɪʃ] *v* 1. yenidən doldurmaq/ əlavə etmək; artırmaq; **to ~ supplies** ehtiyatı artırmaq; *Let me replenish your glass with wine Qoy/ Qoyun badəni/ badənizi yenidən şərabla doldurum*; 2. əlavə tökmək *(yanacaq)*

**replenishment** [rɪˈplenɪʃmənt] *n* yenidən doldurma/əlavə etmə; dolma

**replete** [rɪˈpliːt] *adj* 1. doldurulmuş, dolmuş; doymuş; dolu; **to be ~ with** dolu/bol/çox olmaq; ~ **with food** həddindən çox yemiş; 2. zəngin, bol, çoxlu; **a home ~ with every comfort** hər cür rahatlığı olan ev

**repletion** [rɪˈpliːʃn] *n* 1. doyma; **to eat to ~** doyana qədər/doyunca yemək; 2. doldurma, ağzınacan doldurma; **a vessel filled to ~** ağzına qədər/ağzınacan doldurulmuş qab; *The house was filled to repletion with children Ev ağzınacan uşaqla dolu idi*; 3. ödəmə; təmin etmə; **the ~ of wants** ehtiyacları ödəmə/təmin etmə

**replica** [ˈreplɪkə] *n* 1. tam surət; **to make a ~ of *smth*.** bir şeyin tam/eyni surətini çıxarmaq; 2. tam oxşarlıq; *She was a replica of her mother O tam anasının surətidir, O bütünlükdə anasına oxşayırdı*

**replicate** [ˈreplɪkeɪt] *v* 1. qatlamaq, bükmək; 2. surətini çıxartmaq; 3. təkrar etmək

**replication** [ˌreplɪˈkeɪʃn] *n* 1. cavab; etiraz; **a quick and concise ~** cəld və yığcam cavab; 2. əks-səda; 3. surətini çıxartma

**reply**[1] [rɪˈplaɪ] *n* 1. cavab; **in ~** cavab olaraq; **in ~ to my letter** mənim məktubuma cavab olaraq; **to make a ~** cavab vermək; *I asked him, but he made no reply Mən ondan soruşdum, lakin o heç bir cavab vermədi*; 2. *hüq*. vəkilin məhkəmədə yekun çıxışı

**reply**[2] [rɪ'plaɪ] *v* (*pt, pp* **replied**) 1. cavab vermək; **to ~ to a question** suala cavab vermək; **to ~ for** *smb.* bir kəsin əvəzinə/yerinə cavab vermək; *Have you replied to his letter? Sən/Siz onun məktubuna cavab verdinmi?/verdinizmi?*; 2. cavab tədbiri görmək; **to ~ to the enemy's fire** düşmənin atəşinə cavab vermək
**repolish** ['ri:'pɒlɪʃ] *v* yenidən cilalamaq, parlayana qədər sürtmək
**report**[1] [rɪ'pɔ:t] *n* 1. məruzə; **final** ~ son/ yekun məruzə; 2. məlumat; **newspaper ~s** qəzet məlumatları/reportajları; **to read some newspaper ~s of the accident** hadisə haqqında bəzi qəzet məlumatlarını oxumaq; 3. hesabat; **a ~ on** *smth.* bir şey haqqında hesabat; **to present/to submit a** ~ hesabat təqdim etmək; **to draw up a ~ on an accident** hadisə haqqında hesabat /protokol tərtib etmək; 4. şayiə; **to know of** *smth.* **by** ~ bir şeyi şayiə vasitəsilə öyrənmək; *The report goes Şayiə gəzir*; 5. ad, şöhrət, şərəf; **to be of good/of evil** ~ yaxşı/pis ada malik olmaq; 6. qiymət cədvəli; **terminal** ~ rüb üçün qiymət cədvəli
**report**[2] [rɪ'pɔ:t] *v* 1. xəbər/məlumat vermək; danışmaq; təsvir etmək; **to ~ an accident to the police** hadisə haqqında polisə xəbər/məlumat vermək; *He reported what he had seen O, gördükləri haqqında məlumat verdi, O, gördüklərini danışdı; It is reported 1) Məlumat/Xəbər verilir; It is reported from London Londondan xəbər verilir; 2) deyirlər; It is reported that we are to have a new teacher Deyirlər ki, bizim təzə/yeni müəllimimiz olacaq*; 3) rəsmi olaraq xəbər/hesabat vermək; **to ~ to a superior** rəisə rəsmi hesabat vermək; 2. hesabat hazırlamaq/vermək; reportaj vermək; **to ~ a speech/a meeting** çıxış/iclas haqqında reportaj vermək; 3. şikayət etmək, şikayətlənmək *(bir kəsdən)*; **to ~ to a superior** rəisə şikayət etmək; **to ~** *smb.* **for insolence** bir kəsin kobudluğundan /ədəbsizliyindən/qabalığından şikayətlənmək; **to ~** *smb.* **to the police** bir kəsdən polisə şikayət etmək; 4. **(on, upon, of)** fikir söyləmək, rəy bildirmək; **to ~ on/upon/of** *smb.* bir kəs haqqında fikir söyləmək; **to ~ well/badly on** *smb.* bir kəs haqqında yaxşı/pis fikir söyləmək; *He reports well of the scheme O, plan haqqında yaxşı fikirdədir*; 5. gəlmək; **to ~ to** *one's* **unit** *hərb.* öz bölməsinə gəlmək; **to ~ oneself** gəlməsi haqqında məlumat vermək; *Report yourself to the manager Gəlməyin/Gəlməyiniz barədə müdirə məlumat ver/verin*;
◊ **to ~ progress** 1) işlərin gedişi barədə məlumat vermək; 2) qanun layihəsinin müzakirəsini dayandırmaq; 3) təxirə salmaq *(bir şeyi)*; **to move to ~ progress** müzakirələri təxirə salmaq haqqında təklif vermək *(parlamentdə)*
**reportage** [rɪ'pɔ:tɪdʒ, repɔ:'ta:dʒ] *n* reportaj
**reporter** [rɪ'pɔ:tə] *n* 1. müxbir, reportyor *(gündəlik yerli xəbərlər toplayan qəzet işçisi)*; 2. məruzəçi; 3. radioreportyor
**reporting centre** [rɪ'pɔ:tɪŋ'sentə] *n* çağırış məntəqəsi/mərkəzi
**repose**[1] [rɪ'pouz] *n* 1. istirahət, dincəlmə; tənəffüs, fasilə, ara; **calm** ~ sakit istirahət; **a night's** ~ bir gecəlik istirahət/dincəlmə; **the ~ of a hot summer afternoon** isti yay axşamüstü istirahəti; **to work without** ~ dincəlmədən/istirahət etmədən işləmək; **to disturb** *smb.'s* ~ bir kəsin istirahətini pozmaq; 2. sakitlik, sükut, rahatlıq; **dead** ~ ölü sükut; 3. yuxu; *Good night and sweet repose Gecən/Gecəniz xeyrə qalsın və yuxun/yuxunuz şirin olsun*
**repose**[2] [rɪ'pouz] *v* I 1. dincəlmək, istirahət etmək *(həm də* **to ~ oneself**); **to ~ on a couch** divanda dincəlmək; 2. basdırılmaq, dəfn edilmək; 3. qoymaq; **to ~** *one's* **head on the pillow** başını balıncın üstünə qoymaq
**repose** [rɪ'pouz] *v* II 1. ümid/arxayın olmaq, bel bağlamaq, inanmaq, etibar etmək; **to ~ trust in** *smb.* bir kəsə bel bağlamaq/etibar etmək/inanmaq; 2. vəkalət vermək *(bir kəsə)*; **to ~ power in** *smb.'s* **hands** hakimiyyəti bir kəsin əlinə vermək
**reposit** [rɪ'pɒzɪt] *v* saxlamaq, qorumaq, saxlamaq üçün vermək; *The original copy is reposited in the museum Orijinal surət muzeydə saxlanılır*
**reposition** [ˌri:pə'zɪʃn] *n* saxlamaq üçün vermə
**repository** [rɪ'pɒzɪtrɪ] *n* 1. anbar, ...saxlanılan yer; **a furniture** ~ mebel anbarı, mebel saxlamaq üçün yer; 2. yaxın adam, sirdaş; dost; 3. sərdabə; 4. muzey
**repossess** [ˌri:pə'zes] *v* yenidən ələ almaq/ sahib olmaq; **to ~ furniture** mebelə yenidən sahib olmaq
**represent** [ˌreprɪ'zent] *v* 1. təsvir etmək; *The picture represents a hunting scene Bu şəkil ov səhnəsini təsvir edir*; 2.: **to ~ oneself as...** özünü ...kimi aparmaq/ ...kimi dəyişmək; *He represented himself as an expert O özünü ekspert kimi göstərdi/apardı*; 3. təcəssüm etdirmək, ifadə etmək; bildirmək; *Phonetic signs represent sounds Fonetik işarələr səsləri ifadə edir/bildirir*; 4. rol oynamaq/ifa etmək; səhnəyə qoymaq; **to ~ a play** pyesi səhnəyə qoymaq/oynamaq; 5. təmsil etmək; *He represented the town in Parliament O, parlamentdə şəhəri təmsil etdi*
**representation** [ˌreprɪzen'teɪʃn] *n* 1. təsvir, təsvir etmə; surət; **a ~ of the triumphal arch** zəfər tağının təsviri; **an allegoric** ~ alleqorik təsvir; *This painting is a representation of a storm at sea Bu şəkil dənizdə tufanı təsvir edir*; 2. təqdimat, təqdim etmə; 3. təkid, müddəa, iddia; **to consent to do** *smth.* **on** *smb.'s* ~ bir kəsin təkidi ilə bir şeyi etməyə razılıq vermək/ razı ol-



maq; 4. protest, ciddi etiraz; **to make ~s to** *smb.* bir kəsə ciddi etiraz etmək; 5. nümayəndəlik; **permanent** ~ daimi nümayəndəlik
**representative**[1] [ˌreprɪ'zentətɪv] *n* 1. nümunə, növ; 2. nümayəndə; elçi; **~s of the press** mətbuatın nümayəndələri; **diplomatic/personal /special/permanent** ~ diplomatik/şəxsi/xüsusi /daimi nümayəndə; 3. **Reprezentative** nümayəndələr palatasının üzvü; **House of Representatives** Nümayəndələr palatası
**representative**[2] [ˌreprɪ'zentətɪv] *adj* 1. göstərən; təsvir edən; **books ~ of pastoral life** kənd həyatını təsvir edən kitablar; 2. xarakterik, tipik; *Detroit is a representative American city Detroyt tipik amerikan şəhəridir*; 3. nüfuzlu, səlahiyyətli, mötəbər; **a ~ body/ government** səlahiyyətli orqan/hökumət
**repress** [rɪ'pres] *v* 1. yatırtmaq; boğmaq; **to ~ an uprising** üsyan yatırtmaq/boğmaq; 2. əzmək, incitmək, əziyyət/sıxıntı vermək; *The parents repressed their children Valideynlər uşaqlarına əziyyət verdilər*; 3. cəzalandırmaq; 4. saxlamaq, gizlətmək, qabağını almaq; **to ~ a sneeze** asqırmağı saxlamaq; **to ~ tears** göz yaşlarını gizlətmək; **to ~ passions** ehtirasları cilovlamaq/boğmaq
**repressed** [rɪ'prest] *adj* 1. yatırılmış, boğulmuş; **~ desire** boğulmuş arzu; 2. qarşısı alınmış; **~ fear** qarşısı alınmış qorxu
**repression** [rɪ'preʃn] *n* 1. yatırma, əzmə; 2. repressiya, cəza, cəza tədbirləri; **victims of government** ~ hökumət repressiyasının qurbanları; 3. qarşısının alınması *(hissin və s.)*
**repressive** [rɪ'presɪv] *adj* repressiv, cəza; **~ measures** cəza tədbirləri
**reprieve**[1] [rɪ'pri:v] *n* 1. ölüm hökmünün icrasını təxirə salma; ölüm hökmünün möhlətini uzatma; 2. ölüm hökmünün icrasının təxirə salınması/möhlətinin uzadılması haqqında göstəriş/sərəncam; 3. nəfəs alma/dərmə; tənəffüs
**reprieve**[2] [rɪ'pri:v] *v* ölüm hökmünün icrasını təxirə salmaq, ölüm hökmünün icrasının möhlətini uzatmaq
**reprimand**[1] ['reprɪma:nd] *n* töhmət, məzəmmət
**reprimand**[2] ['reprɪma:nd] *v* töhmət vermək/elan etmək, məzəmmətləmək, məzəmmət etmək
**reprint**[1] ['ri:prɪnt] *n* dəyişiklik edilmədən nəşr; yenidən çap etmə/üzünü köçürmə
**reprint**[2] [ˌri:'prɪnt] *v* 1. yenidən/təkrar nəşr etmək; 2. yenidən yazmaq *(yazı makinasında)*
**reprisal** [rɪ'praɪzl] *n* *hüq.* 1. təzyiq tədbirləri; **positive/negative ~s** müsbət/ mənfi təzyiq tədbirləri; **law of** ~ cəza qanunu; 2. cavab tədbiri; **to make ~s** qisas/intiqam almaq
**reproach**[1] [rɪ'proutʃ] *n* 1. danlaq, məzəmmət, qınaq, qınama, tənə; **to heap ~es on** *smb.* bir kəsi bərk danlamaq/ məzəmmətləmək; 2. biabırçılıq, rüsvayçılıq, bədnamlıq, üzüqaralıq; *These slums are a reproach to the town Bu xarabalıqlar şəhər üçün biabırçılıqdır/rüsvayçılıqdır*; **to bring ~ on** *smb.* bir kəsi rüsvay etmək; **to live in ~ and ignominy** rüsvayçılıq içində və şərəfsiz yaşamaq;
◊ **beyond/above** ~ eyibsiz, nöqsansız, qüsursuz; **a life without** ~ eyibsiz/ qüsursuz həyat
**reproach**[2] [rɪ'proutʃ] *v* 1. danlamaq, qınamaq, tənə vurmaq, məzəmmət etmək; *He reproached the girl with laziness/for being lazy O, qızı tənbəllikdə/tənbəl olmaqda məzəmmət etdi*; 2. *arx.* rüsvay/ biabır etmək; *This will reproach him Bu onu rüsvay/biabır edəcək*
**reproachful** [rɪ'proutʃfl] *adj* 1. tənəli, narazı; **~ words** tənəli sözlər; **in a ~ tone** tənəli/narazı tonla; 2. danlağa/qınağa/ tənəyə layiq, biabırçı, rüsvayçı
**reproachfully** [rɪ'proutʃflɪ] *adv* tənəli, məzəmmətlə, tənəli-tənəli; **to speak** ~ məzəmmətlə/tənəli-tənəli danışmaq
**reprobate**[1] ['reprəbeɪt] *n* 1. əxlaqsız, pozğun *(adam)*; 2. yaramaz, alçaq, əclaf *(adam)*
**reprobate**[2] ['reproubeɪt] *adj* 1. əxlaqsız, ədəbsiz, pozğun; **~ behaviour** əxlaqsız/ ədəbsiz davranış; 2. yaramaz, alçaq, əclaf
**reprobate**[3] ['reproubeɪt] *v* 1. məzəmmətləmək, məzəmmət etmək, tənə vurmaq, danlamaq; pisləmək, qınamaq; 2. rədd etmək, qəbul etməmək
**reproduce** [ˌri:prə'dju:s] *v* 1. doğmaq, törəmək, doğub törəmək; **to ~** *one's* **kind**, **to ~ oneself** doğub törəmək; 2. bərpa etmək, əvvəlki halına salmaq; 3. yada salmaq *(keçmişi və s.)*; təsəvvür etmək *(fikrən)*
**reproduction** [ˌri:prə'dʌkʃn] *n* 1. yenidən hasil etmə, təkrar istehsal; 2. çoxaltma, çoxalma; *The reproduction of the cod is extraordinarily fast Treska (balıq növü) çox sürətlə çoxalır/artır*; 3. surət, surətini çıxartma; 4. yada salma, fikrə gətirmə; 5. bərpa etmə, regenerasiya *(heyvanların itirmiş olduqları orqanları yenidən bərpa etməsi)*; 6. *iqt.* təkrar istehsal
**reproductive** [ˌri:prə'dʌktɪv] *adj* 1. təkrar istehsal; **~ power** təkrar istehsal gücü/ qüvvəsi; 2. *biol.* cinsi; **~ organs** cinsi orqanlar
**reproof** [rɪ'pru:f] *n* məzəmmət, qınaq, qınama, tənə, danlaq; **a glance of** ~ tənəli baxış; **to administer a sharp ~ to** *smb.* bir kəsi kəskin danlamaq, bir kəsi ciddi məzəmmət etmək; *She ignored her mother's look of reproof Qız anasının tənəli baxışına əhəmiyyət vermədi/ etinasızlıq göstərdi*
**reproovable** [rɪ'pru:vəbl] *adj* məzəmmətə/tənəyə/danlağa layiq
**reprove** [rɪ'pru:v] *v* töhmətləmək, danlamaq, məzəmmətləmək, qınamaq; tənə vurmaq; **to ~ for being rude** kobudluğa görə danlamaq; *The priest reproved people for not attending church*

*more often Kilsəyə tez-tez gəlmədiklərinə görə keşiş adamları məzəmmətlədi*

**reproving** [rɪ'pru:vɪŋ] *adj* tənəli, məzəmmətli; **a ~ glance** tənəli baxış

**reprovingly** [rɪ'pru:vɪŋlɪ] *adv* tənə ilə, məzəmmətlə, tənəli/məzəmmətli bir tərzdə, tənəli-tənəli

**reptile** ['reptaɪl] *n* **1**. *zool.* sürünən; *Snakes, lizards, tortoises and crocodiles are all reptiles İlanlar, kərtənkələlər, tısbağalar və timsahlar hamısı sürünənlərdir*; **2**. alçaq, əclaf, rəzil, satqın

**republic** [rɪ'pʌblɪk] *n* respublika; **the Azerbaijan ~** Azərbaycan Respublikası; **people's ~** xalq respublikası; **sister ~** qardaş respublika

**republican**[1] [rɪ'pʌblɪkən] *n* **1**. respublikaçı; **2**. **Republican** Amerikada respublikaçılar partiyasının üzvü

**republican**[2] [rɪ'pʌblɪkən] *adj* respublikaçı; **a ~ movement** respublikaçılar hərəkatı; **a ~ party** respublikaçılar partiyası

**republicanism** [rɪ'pʌblɪkənɪzm] *n* **1**. respublikaçılıq; **2**. idarəetmənin respublika forması

**repudiate** [rɪ'pju:dɪeɪt] *v* **1**. dönmək, danmaq, inkar etmək; üz döndərmək; **to ~ the authorship of a book** kitabın müəllifini danmaq; **to ~ *one's* former friends** köhnə dostlarından üz döndərmək; **2**. rədd etmək, qəbul etməmək; **to ~ *smb.'s* gift** bir kəsin hədiyyəsini qəbul etməmək; **3**. borcu ödəməkdən imtina etmək; borcu ləğv etmək; **4**. arvadı boşamaq

**repudiation** [rɪ.pju:dɪ'eɪʃn] *n* **1**. dönmə, üz döndərmə, əl çəkmə; **2**. inkar etmə, danma; **~ of *one's* authorship** müəllifliyini inkar etmə/danma; **3**. qəbul etməmə; tabe olmama; **4**. borcu ödəməkdən/vədi yerinə yetirməkdən imtina etmə/boyun qaçırma; borcları ləğv etmə *(xüs. dövlət borclarını)*; **5**, arvadı boşama

**repugnance** [rɪ'pʌgnəns] *n* **1**. nifrət, antipatiya, xoşlamama, meylsizlik; **a marked ~** açıq nifrət/antipatiya; **2**. ziddiyyət, təzad, uyuşmazlıq; məntiqsizlik; *The draft must be free from errors or repugnance Layihədə səhvlər və ziddiyyətlər olmamalıdır*

**repugnant** [rɪ'pʌgnənt] *adj* **1**. çox pis, iyrənc, mənfur, murdar, çox çirkin; **~ odour** çox pis/iyrənc iy; üfunət; *All food was repugnant to me during my illness Xəstəliyim müddətində bütün yeməklər mənim üçün iyrənc idi*; **2**. uyuşmayan, ziddiyyətli, bir yerə sığışmayan; *His actions are repugnant to his words Onun hərəkətləri sözləri ilə ziddiyyət təşkil edir/uyuşmur*; **3**. düşmən, çəkişən; **~ forces** düşmən/çəkişən qüvvələr

**repulse**[1] [rɪ'pʌls] *n* rədd etmə; boyun qaçırma, imtina etmə; rədd; **to suffer/to meet with ~** məğlub olmaq, məğlubiyyətə düçar olmaq

**repulse**[2] [rɪ'pʌls] *v* rədd etmək, qaytarmaq; **to ~ an attack** *hərb.* hücumu dəf etmək; **to ~ a request** xahişi rədd etmək; *He offered to help but was repulsed O, kömək təklif etdi, lakin onun təklifi rədd edildi*

**repulsion** [rɪ'pʌlʃn] *n* **1**. nifrət, antipatiya, meylsizlik, xoşlamama, ürəyə yatmama; **to feel a ~ for *smb*.** bir kəsə qarşı nifrət/ antipatiya hiss etmək; **2**. dəf etmə *(düşməni)*; **the ~ of the enemy army** düşmən ordusunu dəf etmə

**repulsive** [rɪ'pʌlsɪv] *adj* **1**. iyrənc, mənfur, murdar, çox pis; **~ sight** iyrənc/mənfur mənzərə; **a ~ smell** çox pis/iyrənc/ mənfur iy; üfunət; **~ manners** iyrənc/çox pis ədalar; **2**. rədd edən, qəbul etməyən; **countries ~ of this alliance** bu ittifaqı/birliyi qəbul etməyən ölkələr; **3**. *fiz.* qaytarma, dəf etmə; **~ force** dəf etmə/qaytarma gücü

**repulsively** [rɪ'pʌlsɪvlɪ] *adv* çox pis, murdar, iyrənc, mənfur tərzdə

**repulsiveness** [rɪ'pʌlsɪvnɪs] *n* iyrənclik, mənfurluq, murdarlıq, yaramazlıq

**reputable** ['repjutəbl] *adj* hörmətli, hörmətə layiq; mötəbər, etibarlı; **a ~ firm of builders** inşaatçıların mötəbər/etibarlı firması

**reputation** [.repju'teɪʃn] *n* ad, şöhrət, şərəf, etibar; **to be a person of good/of high ~** yüksək şöhrətə sahib adam olmaq; **to have a good/a high ~** yaxşı ada/şöhrətə malik olmaq; **a scientist of world ~** dünya şöhrətli alim; *She has lost her reputation O, şöhrətini/şərəfini itirib*; **to build up/to make a ~ (for oneself)** özünə şöhrət/ad/şərəf qazanmaq

**repute** [rɪ'pju:t] *n* **1**. şöhrət, ad; **a footballer of world ~** dünya şöhrətli futbolçu; **a house of ill ~** pis ad çıxarmış ev, fahişəxana; **to be in good/in bad ~** yaxşı/pis ad çıxartmaq; **2**. məşhurluq, şan-şöhrət; **writers of ~** məşhur/şan-şöhrətli yazıçılar; **a wine of ~** məşhur/ yaxşı ad qazanmış şərab; **of no ~** tanınmayan, naməlum, məlum olmayan; **to bring *smb.'s* name into ~** bir kəsi məşhurlaşdırmaq/tanıtmaq

**reputed** [rɪ'pju:tɪd] *adj* **1**. məşhur, tanınmış; *He is reputed in the town O, şəhərdə məşhurdur*; **2**. təxminən/güman/ ehtimal/fərz edilən, nəzərdə tutulan; **the ~ father of her baby** onun uşağının güman/ehtimal edilən atası

**request**[1] [rɪ'kwest] *n* **1**. xahiş, rica, təvəqqe, istək, dilək; *Her request was granted Onun xahişi yerinə yetirildi*; **at/by ~** xahişə görə, xahişlə; *We did it at his request Biz bunu onun xahişinə görə etdik; She sang by our request O bizim xahişimizlə oxudu*; **to make ~ for *smth*.** bir şey üçün xahiş etmək; **2**. tələbnamə; tələbat; **in great ~** böyük tələbatı olan, çox tələb olunan

**request**[2] [rɪ'kwest] *v* xahiş etmək; *An answer is requested Xahiş olunur, cavab verəsiniz; I requested them to stop making a noise Mən onlardan xahiş etdim ki, səs salmağı dayandırsınlar/səs salmasınlar*

**require** [rɪ'kwaɪə^r] *v* **1**. tələb etmək, istəmək;



əmr /hökm etmək; *All passengers are required to show their tickets Bütün sərnişinlərdən xahiş olunur ki, biletlərini göstərsinlər; Do you require anything of me? Sən/Siz məndən bir şey tələb edirsənmi/edirsinizmi?*; **2**. ehtiyacı/ tələbatı olmaq *(bir şeyə)*; tələb etmək; *This plant requires plenty of water Bu bitki çox su tələb edir; We require extra help Bizim əlavə köməyə ehtiyacımız var*

**required** [rɪ'kwaɪəd^r] *adj* tələb olunan, vacib; **~ subjects** *amer.* vacib fənlər

**requirement** [rɪ'kwaɪəmənt] *n* **1**. tələb, tələb etmə, istəmə; vacib şərt; **to fulfil the ~s of the law** qanunun tələblərini yerinə yetirmək; **to make *one's* ~s known** öz tələblərini bildirmək; *What are his requirements? Onun tələbləri/ şərtləri nədir?*; **2**. ehtiyac, tələbat; **to meet the ~s** tələbatları ödəmək; **the daily ~s** gündəlik ehtiyaclar/tələbatlar

**requisite**[1] ['rekwɪzɪt] *n* vacib/lazım olan şey; **travelling ~s** səyahət üçün lazım olan şeylər; **sports ~s** idman üçün lazım olan şeylər/ləvazimat

**requisite**[2] ['rekwɪzɪt] *adj* gərəkli, lazım, lazımi; lazım olan, zəruri, vacib; **the ~ number of votes for election** seçim üçün vacib/lazım olan səs miqdarı; **the ~ measures** lazımi/vacib tədbirlər; **everything ~ for a long journey** uzaq səyahət üçün lazım olan hər şey

**requisition**[1] [.rekwɪ'zɪʃn] *n* **1**. tələb, tələb etmə; **under the ~ of the town council** şəhər şurasının tələbi ilə; **to be in ~** tələb olunmaq; **2**. tələbnamə; **~ for materials** materiallar üçün tələbnamə; **3**. şərt; **the ~s for a university degree** universitet diplomu almaq üçün şərtlər; **4**. müsadirə, rekvizisiya; **to bring/to call into ~, to put/to place in ~** müsadirə etmək; dövriyyəyə buraxmaq, istifadə etmək

**requisition**[2] [.rekwɪ'zɪʃn] *v* müsadirə etmək; **to ~ horses for troops** atları ordu üçün müsadirə etmək

**requital** [rɪ'kwaɪtl] *n* **1**. əvəz *(mükafat və ya cəza)*; mükafat, mükafat vermə; kompensasiya; *I gave him 10 dollars in requital of his help Onun köməyi əvəzində mən ona 10 dollar verdim*; **to make full ~** tam hesablaşmaq, haqq-hesab çəkib üzülüşmək; *I have made full requital Mən haqq-hesab çəkib üzülüşdüm*; **to get food and lodgings in ~ for *one's* services** xidmətinin əvəzində yemək və yataq yeri almaq; **2**. qisas; **in ~ of the act of perfidy** satqınlığa görə qisas; **to be killed in ~ for *one's* crimes** cinayətləri üçün öldürülmək

**requite** [rɪ'kwaɪt] *v* **1**. mükafatlandırmaq, mükafat/əvəz/cavab vermək; **to ~ *smb*. for his services** xidmətinə görə bir kəsə mükafat vermək; **to ~ *smb.'s* love** bir kəsin məhəbbətinə/sevgisinə cavab vermək; **to ~ good with evil** yaxşılığa yamanlıqla/xeyrə şərlə cavab vermək; **2**. qisas almaq; **to ~ for wrong** haqsızlığa görə qisas almaq

**reroute** ['ri:'ru:t] *v* marşrutu/istiqaməti dəyişmək

**rerun** ['ri:rʌn] *n amer.* **1**. kinofilmin təkrar göstərilməsi; **2**. radio verilişinin təkrar yayımlanması *(həm də* **~ of broadcast)**

**resaddle** ['ri:'sædl] *v* yenidən yəhərləmək *(atı)*

**resale** ['ri:seɪl] *n* alıb satma, alğı-satqı

**reschedule** [.ri:'ʃedju:l] *v* planı dəyişdirmək

**rescind** [rɪ'sɪnd] *v* ləğv etmək; **to ~ a contract/a decision** kontraktı/qərarı ləğv etmək

**rescission** [rɪ'sɪʒn] *n* ləğv etmə, pozma

**rescue**[1] ['reskju:] *n* **1**..qurtuluş, nicat; xilas, xilas etmə/olma; azad etmə/olma, qurtarma; **to come to the ~** köməyə gəlmək; **to go to ~** köməyə getmək; **2**. *hüq*. zorla həbsdən azad etmə, zorla həbsdən azad edilmiş şəxs

**rescue**[2] ['reskju:] *v* **1**. xilas etmək, qurtarmaq; **to ~ *smb*. from danger** bir kəsi təhlükədən qurtarmaq/xilas etmək; **to ~ *smb*. from drowning** bir kəsi batmaqdan xilas etmək; *Police rescued the hostages Polis girovları azad/xilas etdi*; **2**. *hüq*. dustağı zorla/zor işlətməklə azad etmək

**rescuer** ['reskju:ə^r] *n* xilaskar, xilas edən

**reseal** ['ri:'si:l] *v* yenidən möhür vurmaq/ möhürləmək; *The letter was opened and resealed Məktub açıldı və yenidən möhürləndi*

**research**[1] [rɪ'sə:tʃ] *n* **1**. tədqiqat, tədqiqat aparma, öyrənmə, elmi-tədqiqat işi; **to be engaged in ~** elmi-tədqiqat işi ilə məşğul olmaq; **to carry out a ~ into/for the causes of the disease** xəstəliyin səbəblərini tədqiq etmək/araşdırmaq; **space ~** kosmik fəzanın tədqiqi; *His researches have been successful Onun tədqiqatları müvəffəqiyyətli olub*; **2**. axtarış; **a ~ after oil** neft axtarışı

**research**[2] [rɪ'sə:tʃ] *v* tədqiq etmək, araşdırmaq, öyrənmək, tədqiqatla məşğul olmaq, tədqiqat aparmaq

**researcher** [rɪ'sə:tʃə^r] *n* tədqiqatçı, araşdırıcı

**resell** [.ri:'sel] *v (pt, pp* **resold** [.ri:'sould]) alıb-satmaq

**resemblance** [rɪ'zembləns] *n* oxşarlıq, oxşayış, bənzərlik, bənzəyiş; **a family ~** ailə oxşarlığı; **a close ~** yaxın oxşayış/ bənzəyiş; *There is a great resemblance between the children Uşaqlar arasında böyük oxşarlıq var*; **to bear ~ to *smb*.** bir kəsə oxşamaq; **to have a strong ~ to *smb./to smth*.** bir kəsə/şeyə çox oxşamaq

**resemble** [rɪ'zembl] *v (Məchul növdə və davamedici zaman formalarında işlənmir)* oxşamaq; *The child resembles his father Uşaq atasına oxşayır*

**resent** [rɪ'zent] *v* acıqlanmaq, hiddətlənmək, qəzəblənmək, qeyzlənmək; *Does he resent my being here? O mənim burada olmağımdan qəzəblənirmi?*

**resentful** [rɪ'zentfl] *adj* acıqlı, hiddətli, qəzəbli, qeyzli; **a ~ look** hiddətli/qəzəbli/ acıqlı baxış; **a ~ voice** acıqlı/qəzəbli/ qeyzli səs

**resentfully** [rɪ'zentflɪ] *adv* hiddətlə, qəzəblə, qeyzlə, acıqla; hiddətli/qeyzli/ qəzəbli/acıqlı bir tərzdə; acıqlı-acıqlı, qəzəbli-qəzəbli
**resentment** [rɪ'zentmənt] *n* hiddət, qəzəb, qeyz, kin, acıq; narazılıq; to bear/to have no ~ against *smb.* bir kəsə qarşı narazılığı/kini olmamaq; to harbour/to cherish ~ against/towards *smb.* bir kəsə qarşı kin bəsləmək
**reservation** [ˌrezə'veɪʃn] *n* 1. saxlama, ehtiyat/ehtiyatda saxlama; 2. qeyd, qeyd-şərt; without ~ qeyd-şərtsiz; *I accept it without reservation Mən bunu qeyd-şərtsiz qəbul edirəm*; to make ~s şərt qoymaq; 3. *amer.* qabaqcadan/ əvvəlcədən edilmiş sifariş *(mehmanxanada yer və s.)*; to make a ~ yer sifariş etmək; 4. əvvəlcə sifariş edilmiş yer *(mehmanxanada və s.)*; 5. rezervasiya yeri *(Amerikada, Avstraliyada, Kanadada hinduların yaşaması üçün ayrılmış yer)*; 6. *amer.* qoruq, qoruq yeri; 7. ehtiyat yer *(yolun ortasında olan və hərəkəti ikiyə bölən zolaq)*
**reserve¹** [rɪ'zɜ:v] *n* 1. ehtiyat; the gold ~ qızıl ehtiyatı; a ~ of food ərzaq/azuqə ehtiyatı; in ~ ehtiyatda; funds kept/held in ~ ehtiyatda saxlanılan fondlar; to keep a ~ ehtiyatı olmaq; 2. *id.* ehtiyat/ehtiyatda olan oyunçu; 3. qoruq; 4. qeyd-şərt; without ~ qeyd-şərtsiz, tamamilə; *We accepted your proposal without reserve Biz sənin/sizin təklifini/təklifinizi qeyd-şərtsiz qəbul etdik*; 5. təmkinlilik, təmkin, səbirlilik, özünü /nəfsini saxlaya bilmə; 6. ehtiyatlılıq, sirr verməzlik; 7. ehtiyat hərbi qüvvə; to call out the ~(s) ehtiyatda olanları çağırmaq *(hərbi xidmətə)*; *He is in/on the reserve O, ehtiyatdadır*
**reserve²** [rɪ'zɜ:v] *v* 1. yığmaq, saxlamaq, toplamaq; to ~ money for rainy days qara gün üçün pul yığmaq/toplamaq/ saxlamaq; to ~ oneself for *smth.* özünü bir iş görmək üçün saxlamaq; *Reserve your strength for the climb Gücünü/ Gücünüzü dırmaşmaq (dağa) üçün saxla/ saxlayın*; 2. *hərb.* ehtiyatda saxlamaq; 3. təxirə salmaq; *The judge reserved his decision Hakim qərarını təxirə saldı*; 4. əvvəlcədən/qabaqcadan sifariş etmək; to ~ a seat 1) yer sifariş etmək *(mehmanxanada və s.)*; to ~ a room əvvəlcədən/qabaqcadan otaq sifariş etmək *(mehmanxanada)*; 2) əvvəlcədən/ qabaqcadan bilet almaq/sifariş etmək
**reserved** [rɪ'zɜ:vd] *adj* 1. ehtiyat; ehtiyatda olan; ~ list 1) *hərb.* ehtiyatda olan zabitlərin siyahısı; 2) *id.* ehtiyatda olan oyunçuların siyahısı; 2. sifarişli; əvvəlcədən sifariş olunmuş/edilmiş; ~ seat əvvəlcə/əvvəlcədən alınmış bilet *(teatr üçün)*; 3. sirr verməyən, qaradinməz, adamayovuşmaz; a proud and ~ man məğrur və qaradinməz adam
**reservist** [rɪ'zɜ:vɪst] *n hərb.* ehtiyatda olan, ordudan ehtiyata buraxılmış hərbçi
**reservoir** ['rezəvwa:ʳ] *n* 1. hovuz, su hövzəsi, su anbarı; 2. mənbə; a ~ of strength güc mənbəyi; ~ of knowledge bilik mənbəyi
**reset** [ˌri:'set] *v (-tt-; pt, pp* **reset)** 1. yerinə salmaq, yenidən yerləşdirmək *(sağanağa)*; 2. *k.t.* seyrəklətmək, çıxarıb seyrək etmək *(bitkini)*; 3. *tex.* nizama/qaydaya salmaq; 4. imtahan/test üçün yeni suallar hazırlamaq
**resettle** [ˌri:'setl] *v* 1. yerini dəyişmək, başqa yerə qoymaq; 2. köçürmək *(başqa yerə)*; to ~ refugees qaçqınları başqa yerə köçürmək; *They were resettled by force Onlar zorla başqa yerə köçürüldülər*; 3. çökmək; *The mud resettled at the bottom Lil dibə çökdü*
**resettlement** ['ri:'setlmənt] *n* 1. köçürmə *(başqa yerə)*; 2. mülki vəziyyətə keçmə *(hərbi xidmətdən sonra)*
**reshape** [ˌri:'ʃeɪp] *v* yeni forma vermək, dəyişmək, başqa formaya salmaq; to ~ the economy iqtisadiyyatı dəyişdirmək; to ~ *one's* life həyatını dəyişdirmək; to ~ *one's* body bədənini başqa formaya salmaq
**reshuffle¹** ['ri:'ʃʌfl] *n* 1. yer dəyişdirmə; a ~ in the government hökumətdə yerdəyişmə; 2. qarışdırma *(oyun kartını)*
**reshuffle²** ['ri:'ʃʌfl] *v* 1. dəyişdirmək, yer dəyişdirmək; 2. qatışdırmaq, qatmaq *(oyun kartını)*
**reside** [rɪ'zaɪd] *v* 1. (in, at) yaşamaq, məskunlaşmaq; to ~ in the village kənddə yaşamaq; to ~ abroad xaricdə yaşamaq; 2. aid/məxsus olmaq; *Power resides in the people Hakimiyyət xalqa məxsusdur*
**residence** ['rezɪdəns] *n* 1. daimi yaşayış yeri; olduğu yer; to have *one's* ~ yaşamaq; to take up *one's* ~ məskunlaşmaq; to take up *one's* ~ in a new house yeni evdə yaşamaq; to change *one's* ~ yaşayış yerini dəyişmək; *10 Downing Street is the British Prime Minister's official residence Dauninq Strit 10 Britaniya Baş Nazirinin rəsmi yaşayış yeridir*; 2. iqamətgah, rezidensiya, mənzil, ev; official ~ rəsmi rezidensiya/iqamətgah; commercial ~ ticarət evi
**resident¹** ['rezɪdənt] *n* 1. daimi sakin; the ~s of this village/town bu kəndin/ şəhərin sakinləri; 2. rezident *(elçidən bir rütbə aşağı diplomatik nümayəndə)*; 3. iş yerində yaşayan şəxs
**resident²** ['rezɪdənt] *adj* 1. daimi, daimi yaşayan; ~ representative daimi nümayəndə; the ~ population daimi yaşayan əhali; iş yerində yaşayan; ~ physician xəstəxanada yaşayan həkim; 2. (in) xas olan; difficulties ~ in the situation vəziyyətə xas olan çətinliklər; 3. *zool.* köçməyən, köçəri olmayan *(quşlar haq.)*
**residential** [ˌrezɪ'denʃl] *adj* 1. yaşayış, yaşayış üçün; a ~ district/area yaşayış məhəlləsi; a ~ hotel daimi sakini olan mehmanxana; mebel döşənmiş otaqlar; 2. ev, yaşayış; a ~ home for elderly ahıllar üçün yaşayış evi
**residue** ['rezɪdju:] *n* 1. qalıq; ~s of combustion *tex.* yanmanın qalığı; 2. *riyaz.* çıxılma, çıxma, qalıq



**resign** [rɪ'zaɪn] *v* I yenidən imza atmaq/qol çəkmək
**resign** [rɪ'zaɪn] *v* II 1. işindən/vəzifəsindən imtina etmək; istefaya getmək/çıxmaq; to ~ management rəhbərlikdən imtina etmək; to ~ *one's* commission *hərb.* istefaya çıxmaq; to ~ from the Cabinet Kabinetdən /hökumətin tərkibindən çıxmaq; 2. əl çəkmək, imtina etmək *(hüququndan və s.)*; to ~ a claim tələbdən əl çəkmək; to ~ *one's* property əmlakından imtina etmək; 3. vermək *(bir kəsin himayəsinə)*; *I resign my children to her care Mən uşaqlarımı onun himayəsinə verirəm*; 4. dalmaq, qapılmaq; to ~ oneself to mediation fikrə dalmaq; düşüncəyə qapılmaq; 5. oyunu uduzmaq *(şahmatda)*; *Black resigns Qaralar təslim olur/uduzur*
**resignation** [ˌrezɪgn'eɪʃn] *n* 1. vəzifədən imtina etmə; istefaya çıxma, istefa; 2. istefa haqqında ərizə; to give/to send *one's* ~ istefa haqqında ərizə vermək; 3. itaət, itaətkarlıq, boyun əymə; with ~ itaətlə, itaətkarlıqla; to accept *one's* fate with ~ taleyi ilə barışmaq
**resigned** [rɪ'zaɪnd] *adj* 1. itaətli, itaətkar, müti, boyun əyən; razılaşan; ~ to *one's* fate taleyi ilə razılaşan; 2. istefaya çıxmış; the lately ~ prime minister bu yaxınlarda istefaya çıxmış baş nazir
**resignedly** [rɪ'zaɪndlɪ] *adv* itaətlə, itaətkarcasına, itaətkarlıqla, acizanə; to say ~ itaətkarlıqla/acizanə demək
**resile** [rɪ'zaɪl] *v* 1. imtina etmək, boyun qaçırmaq, boynuna götürməmək; to ~ from a contract /from a statement müqavilədən/bəyanatdan boyun qaçırmaq; 2. geri durmaq/çəkilmək; əl çəkmək, qaçmaq, dönmək *(fikrindən və s.)*; *It was too late to resile Geri çəkilmək/durmaq çox gec idi*
**resilience** [rɪ'zɪlɪəns] *n* elastiklik; the ~ of rubber rezinin elastikliyi
**resiliency** [rɪ'zɪlɪənsɪ] *n* 1. = **resilience**; 2. həyat qabiliyyəti, həyata məhəbbət; tez bir zamanda fiziki və ruhi qüvvəsini bərpa etmə
**resilient** [rɪ'zɪlɪənt] *adj* 1. elastik; ~ fabric elastik parça; 2. gülərüzlü, həmişə şən/ şad, ruhdan düşməyən, məyus olmayan, ümidini kəsməyən; ~ disposition həmişə şən/şad xasiyyət
**resin¹** ['rezɪn] *n* qatran; konifol *(iynəyarpaqlı ağacların şirəsindən hasil edilən bərk qatran)*; synthetic ~ süni/sintetik qatran
**resin²** ['rezɪn] *v* 1. qatranlamaq, qatran çəkmək; 2. konifol vurmaq *(kaman yayına)*
**resiniferous** [ˌrezɪ'nɪfərəs] *adj* qatranlı, qatranverən, tərkibində qatran olan
**resinous** ['rezɪnəs] *adj* qatran; the ~ smell of pine trees şam ağaclarının qatran iyi
**resist** [rɪ'zɪst] *v* 1. müqavimət göstərmək, davam gətirmək, tablaşmaq, qarşı durmaq; to ~ disease xəstəliyə müqavimət göstərmək; to ~ an enemy düşmənə müqavimət göstərmək; to ~ an attack hücuma davam gətirmək; 2. əks-təsir göstərmək, dözmək; to ~ damp/frost nəmişliyə/şaxtaya dözmək; 3. qarşı çıxmaq/durmaq; to ~ the call for reform islahat çağırışına qarşı çıxmaq; 4. özünü/nəfsini saxlamaq; to ~ temptation tamahını/nəfsini saxlamaq; *I can't resist a cigarette Mən siqaret çəkməkdən özümü saxlaya bilmirəm*
**resistance** [rɪ'zɪstəns] *n* 1. müqavimət; to offer ~ müqavimət göstərmək; armed ~ silahlı müqavimət; *The demonstrators offered no resistance to the police Nümayişçilər polisə heç bir müqavimət göstərmədilər*; 2. *hərb.* müdafiə; to break down the ~ of the enemy düşmənin müdafiəsini yarmaq; 3. etiraz; *The idea met with some resistance İdeya bəzi etirazlarla qarşılaşdı*; 4. müqavimət qabiliyyəti/gücü; the body's natural ~ to disease bədənin xəstəliyə qarşı təbii müqavimət qabiliyyəti/gücü; 5. *fiz.* müqavimət; ohmic ~ om müqavimət vahidi
**resistant** [rɪ'zɪstənt] *adj* möhkəm, dözümlü, müqavimət göstərən; rats that are ~ to poison zəhərə qarşı dözümlü siçovullar; to be ~ to change dəyişikliyə davamlı/dözümlü olmaq
**resistor** [rɪ'zɪstəʳ] *n el.* müqavimət makarası, reostat
**resold** ['ri:'sould] to resell *felinin pp forması*
**resole** ['ri:'soul] *v* təzə pəncə/daban vurmaq, altı salmaq *(ayaqqabıya)*
**resolute** ['rezəlu:t, 'rezəlju:t] *adj* qəti, dönməz, sarsılmaz, səbatlı, mətin; cəsarətli, əzmli; a ~ man dönməz/ cəsarətli/əzmli adam; a ~ action/ measure qəti hərəkət/tədbir; to be ~ in *one's* demands for peace sülh uğrunda tələblərində əzmli/qətiyyətli olmaq
**resolutely** ['rezəlu:tlɪ, 'rezəlju:tlɪ] *adv* qəti olaraq, cəsarətlə, əzmlə
**resolution** [ˌrezəlu:ʃn, -lju:ʃn] *n* 1. qətiyyət, əzm, səbat; qətilik, möhkəmlik; a man of ~ qətiyyətli adam; to show great ~ böyük qətiyyət/əzm/səbat göstərmək; 2. qətnamə; sərəncam; draft ~ qətnamə layihəsi; joint ~ birgə qətnamə; to pass/to carry/to adopt a ~ qətnamə qəbul etmək; 3. həll etmə; a ~ of the conflict münaqişənin həlli; 4. demontaj, sökmə *(maşını, qurğunu və s.)*
**resolve¹** [rɪ'zɔlv] *n* 1. qərar; to make a ~ qərar qəbul etmək; to keep *one's* ~ qərarından dönməmək; 2. *amer.* qətnamə
**resolve²** [rɪ'zɔlv] *v* 1. qərar qəbul etmək, qərara almaq; *He resolved upon/on making an early start O, tezdən yola düşməyi qərara aldı; What has been resolved? Nə qərar qəbul edildi?*; 2. qətnamə qəbul etmək; 3. cürət/cəsarət etmək; to ~ to do/upon doing *smth.* bir şeyi etməyə cürət etmək; 4. həll etmək; aradan qaldırmaq; to ~ all doubts bütün şübhələri aradan qaldırmaq; *The problem has not yet been resolved*

*Problem hələ də həll olunmayıb*; 5. ayırmaq *(tərkib hissələrinə)*; **to ~ smth. into its elements** bir şeyi elementlərinə/tərkib hissələrinə ayırmaq; 6. ayrılmaq, bölünmək; parçalanmaq, tamamilə dağılmaq; *The Roman Empire resolved into its elements Roma İmperiyası tamamilə dağıldı*; 7. çevrilmək, dönmək; *The water resolves itself into steam Su buxara çevrilir*; 8. *tib.* yox olmaq, çəkilmək, yatmaq *(şiş və s. haq.)*

**resolved** [rɪ'zɔlvd] *adj* qətiyyətli, əzmli; cəsarətli, səbatlı; qəti; **men of ~ temper** qətiyyətli xarakterli adamlar

**resolvedly** [rɪ'zɔlvdlɪ] *adv* qətiyyətlə, cəsarətlə, əzmlə, mətanətlə; qəti surətdə

**resonant¹** ['reznənt] *n fon.* burun samiti

**resonant²** ['reznənt] *adj* 1. uca, gur; ahəngdar, melodik, zil *(səs)*; **a deep, ~ voice** dərin, melodik səs; 2. rezonanslı, rezonans verən; **~ sounds** rezonanslı səslər

**resonate** ['rezəneɪt] *v* rezonans yaratmaq/vermək, əks etdirmək

**resonator** ['rezəneɪtə'] *n* rezonator *(səs ucaldan cihaz)*

**resort¹** ['ri:zɔ:t] *n* 1. müraciət, müraciət etmə; **to make/to have ~ to smb.** bir kəsə müraciət etmək; 2. əl atmaq; **to have ~ to force** gücə əl atmaq; **without ~ to force** gücə əl atmadan; 3. ümid; *That is my only resort Bu mənim yeganə ümidimdir*; 4. sığınacaq/ daldalanacaq yeri; yuva; **~ of thieves** oğruların sığınacaq yeri/ yuvası; 5. kurort *(həm də* **health/holiday ~**); **seaside ~** dənizkənarı kurort; **summer ~** yay kurortu; 6. yığınaq, yığıncaq; *He encouraged the resort of artist O, rəssamların yığıncağından ruhlandı*;
◊ **in the last ~** çarəsiz/əlacsız qaldıqda

**resort²** [rɪ'zɔ:t] *v* **(to)** 1. müraciət etmək, əl atmaq; **to ~ to force** gücə əl atmaq; **to ~ to blows** davaya əl atmaq, dava salmaq; 2. getmək, yola düşmək, yollanmaq; *At the age of twenty-five he resorted to Italy İyirmi beş yaşında o, İtaliyaya getdi*

**re-sort** [.ri:'sɔ:t] *v* yenidən seçmək

**resound** [rɪ'zaund] *v* 1. yenidən səslənmək /səs vermək/eşidilmək; *The sound of cannons resounded from one end of the peninsula to the other Topların gurultusu yarımadanın bu başından o başına qədər yenidən eşidildi*; 2. dolmaq *(səslə)*; *The forest resounded with the songs of birds Meşə yenidən quşların nağməsi ilə dolmuşdu*; 3. təkrar etmək, əks etdirmək *(səs haq.)*; 4. tərif/mədh etmək, tərifləmək; *His name resounded throughout Europe Onun adı bütün Avropada tərifləndi*

**resource¹** [rɪ'sɔ:s] *n* 1. *pl* ehtiyatlar; **natural ~s** təbii ehtiyatlar; **to be at the end of *one's* ~s** bütün ehtiyatlarını tükətmək; 2. imkan, vəsait; **to draw upon *one's* own ~s** öz imkanları/vəsaitləri hesabına keçinmək; **to make the most of *one's* ~s** imkanlardan sona qədər istifadə etmək; *His only remaining resource was flight Onun yeganə imkanı qaçmaq idi*; 3. vaxt keçirmə, məşğuliyyət *(istirahət zamanı)*; *Reading had been her chief resource O əsasən kitab oxumaqla istirahət edirdi*; 4. hazırcavablıq, fərasət, diribaşlıq; **man of great ~** çox fərasətli/çox diribaş adam

**resource²** [rɪ'sɔ:s] *v* vəsaitlə təmin etmək; *The scheme must be properly resourced Plana lazımi qədər vəsait ayrılmalıdır /qoyulmalıdır*

**resourceful** [rɪ'sɔ:sfl] *adj* zirək, diribaş, hazırcavab, usta, bacarıqlı, fərasətli

**resourcefully** [rɪ'sɔ:sfəlɪ] *adv* bacarıqla, ustalıqla, fərasətlə, hazırcavablıqla

**resourcefulness** [rɪ'sɔ:sflnɪs] *n* bacarıq, zirəklik, diribaşlıq, hazırcavablıq, ustalıq, fərasət

**resourceless** [rɪ'sɔ:slɪs] *adj* bacarıqsız, fərasətsiz, aciz

**resow** [.ri:'sou] *v (pt* **resowed** [-d]; *pp* **resown** [-'sɔ:n], *və ya* **resowed** [-d]) 1. *k.t.* yenidən səpmək, təkrar əkmək; 2. yenidən/təkrar/ikinci dəfə ələmək

**resown** ['ri:'soun] **to resow** *felinin pp forması*

**respect¹** [rɪs'pekt] *n* 1. hörmət, ehtiram; **worthy of ~** hörmətə/ehtirama layiq; **out of ~ for *smb.*** bir kəsə hörmətən/hörmət olaraq; **to have ~ for *smb.*, to hold *smb.* in ~** bir kəsə hörmət etmək; **to have ~ for the law** qanuna hörmət etmək; **to win the ~ of all** hamının hörmətini/ehtiramını qazanmaq; **to have lost all ~** bütün hörmətini itirmək; 2. *pl* salam; *Give him my best respects Mənim atəşin salamlarımı ona yetir/yetirin*; 3. diqqət; **to have/to pay ~ to *smth.*** bir şeyə diqqət yetirmək; *İn respect that... Nəzərə alaraq ki,...; In every respect Bütün cəhətdən*; **without ~ to...** asılı olmayaraq..., nəzərə almadan;
◊ **to pay *one's* ~ to *smb.*** bir kəsə olan hörmətini/ehtiramını təsdiq etmək; **~ of persons** üzgörənlik, üz görmə, qərəzkarlıq, tərəfgirlik

**respect²** [rɪs'pekt] *v* 1. hörmət etmək, ehtiram göstərmək; **to ~ *smb.*** bir kəsə hörmət etmək/ehtiram göstərmək; **to ~ oneself** özünə hörmət etmək; **to ~ the law** qanuna hörmət etmək; 2. aid olmaq; *The remaining part of the book respects legislation Kitabın qalan hissəsi qanunvericiliyə aiddir*

**respectability** [rɪ.spektə'bɪlətɪ] *n* 1. hörmətlilik, ləyaqət; mötəbərlik; 2. hörmətli/mötəbər adam

**respectable** [rɪ'spektəbl] *adj* 1. hörmətli, ləyaqətli, mötəbər; **~ behaviour** ləyaqətli davranış; 2. ədəbli, nəzakətli, tərbiyəli; *It is not considered respectable to enter a room without knocking at/on the door Qapını döymədən otağa girmək ədəbsizlik sayılır/hesab olunur*; **a ~ old man** ədəbli qoca kişi; 3. babat, qəbul edilə bilən; **~ weather** babat hava; *The article was respectable but not outstanding Məqalə babat idi, lakin onda qeyri-adi bir şey yox idi*; 4. çox, xeyli, çoxlu; **a ~ money** çoxlu/xeyli pul



**respecter** [rɪs'pektə'] *n* hörmətli/mötəbər adam

**respectful** [rɪs'pektfl] *adj* 1. hörmətli, möhtərəm, ehtiramlı; hörmət edən, ehtiram göstərən; **~ of other people's opinions** başqa adamların fikrinə/rəyinə hörmətlə yanaşan/ehtiram göstərən; 2. xeyli, böyük; **at a ~ distance** xeyli/böyük məsafədə; *We stood at a respectful distance as the funeral procession went by Dəfn mərasimi icra olunarkən biz xeyli aralı məsafədə dayanmışdıq*

**respectfully** [rɪs'pektfəlɪ] *adv* hörmətlə, ehtiramla; ədəblə, nəzakətlə; *Yours respectfully (məktubun sonunda yazılır) Sizə hörmət bəsləyən*

**respectfulness** [rɪs'pektflnɪs] *n* hörmət, ehtiram

**respecting** [rɪs'pektɪŋ] *prep* haqqında, barəsində, dair; **legislation ~ property** əmlak haqqında qanunvericilik/qanunlar; *We could not agree respecting the price Biz qiymət barəsində razılaşa bilmədik*

**respective** [rɪs'pektɪv] *adj* uyğun, müvafiq, uyğun olan/gələn; öz; *My husband and I are each going to visit out respective mothers Ərim və mən hər birimiz öz anamızı görməyə gedirik*

**respectively** [rɪs'pektɪvlɪ] *adv* müvafiq/uyğun olaraq; *The first, second and third prizes went to John, Jane and Nick respectively Birinci, ikinci və üçüncü mükafatı müvafiq olaraq Con, Ceyn və Nik aldı*

**respectworthy** [rɪs'pekt.wə:ðɪ] *adj* hörmətə/ehtirama layiq

**respiration** [.respə'reɪʃn] *n* 1. nəfəs; **normal /artificial ~** normal/süni nəfəs; 2. nəfəs çəkmə /alma; *The respirations are slightly increased Nəfəs alma bir az tezləşib*

**respirator** [.respə'reɪtə'] *n* əleyhqaz; respirator *(ağzı və nəfəs borularını zəhərli qazlardan və tozdan qoruyan cihaz)*

**respiratory** [rɪs'paɪərətərɪ] *adj* respirator; tənəffüs; **~ organs/system** tənəffüs orqanları/sistemi

**respire** [rɪs'paɪə'] *v* nəfəs almaq; *Some reptiles respire through their skin Bəzi sürünənlər dəriləri vasitəsilə nəfəs alırlar*

**respite** ['respaɪt] *n* 1. fasilə; **to work without ~** fasiləsiz işləmək; **a short period of ~** qısamüddətli fasilə; 2. möhlət; **to get a ~** möhlət almaq; **to grant a ~** möhlət vermək

**resplendent** [rɪ'splendnt] *adj* parıldayan, bərq vuran; **the ~ tail feathers of the male peacock** erkək tovuz quşunun quyruq lələklərinin bərq vurması

**respond¹** [rɪs'pɔnd] *n* cavab

**respond²** [rɪs'pɔnd] *v* 1. cavab vermək; **to ~ with a blow** zərbə ilə cavab vermək; 2. reaksiya vermək, baxmaq; **to ~ to kindness** xoş münasibətə reaksiya vermək; *How did they respond to the news? Onlar xəbərə necə reaksiya verdilər?*; 3. *hüq.* 1) məsuliyyət daşımaq; 2) iddia üzrə şikayət vermək; 3) ödəmək, yerini doldurmaq *(xərcin və s.)*

**respondent** [rɪs'pɔndənt] *n* 1. cavabdeh; 2. dissertant; 3. disputçu *(disputda iştirak edən adam)*

**response** [rɪ'spɔns] *n* cavab; *She made no response O cavab vermədi; In response to your inquiry... Sənin/Sizin sorğuna/sorğunuza cavab olaraq...; I received an encouraging response to my letter of application Mən ərizəmə ruhlandırıcı cavab aldım; I knocked at/on the door, but there was no response Mən qapını döydüm, lakin heç bir cavab olmadı; His love met with no response Onun məhəbbəti cavabsız qaldı*

**responsibility** [rɪs.pɔnsə'bɪlɪtɪ] *n* 1. məsuliyyət, cavabdehlik; **criminal ~** cinayət məsuliyyəti; **a post of/a position of ~** məsuliyyətli vəzifə; **to assume/to take/to accept full ~** üzərinə tam məsuliyyət götürmək; *The responsibility rests with the author Məsuliyyət müəllifin üzərinə düşür, Müəllif məsuliyyət daşıyır*; 2. təəhhüd, vəzifə, öhdəlik; **to be relieved of responsibilities** vəzifədən/öhdəlikdən azad olmaq; 3. qəyyumluq altında olan

**responsible** [rɪs'pɔnsəbl] *adj* 1. məsul, cavabdeh, məsuliyyət daşıyan, cavabdeh olan; **~ to *smb.*** bir kəs qarşısında məsuliyyət daşıyan/cavabdeh olan; **to be ~ for *smth.*** 1) bir şeyə görə məsul/cavabdeh olmaq; 2) müəllif olmaq; *He is responsible for these verses Bu şerlərin müəllifi odur*; 2. etibarlı, mötəbər; **a very ~ tenant** çox etibarlı icarədar; **from ~ sources** etibarlı/mötəbər mənbələrdən; 3. *amer.* ödəmə qabiliyyəti olan; 4. olduqca yaxşı; *He had quite responsible clothes Onun çox yaxşı paltarı vardı*

**rest¹** [rest] *n* I 1. istirahət, dinclik; yuxu; **day of ~** istirahət günü; **to have/to take a ~** istirahət etmək, dincəlmək; *Sunday is a day of rest Bazar günü istirahət günüdür; I could get no rest 1) Mən bir an/dəqiqə dincələ bilmədim; 2) Mən bir an gözümü yuma bilmədim*; **to be at ~** sakitləşmək; **to set *smb.*'s mind at ~** bir kəsi sakitləşdirmək; **to set a question at ~** məsələni yoluna qoymaq/həll etmək; **to go/to retire to ~** uzanıb dincəlmək/ yatmaq; 2. *məc.* əbədi istirahət, ölüm; *He has gone to his rest O rəhmətə getdi/ öldü*; **to lay someone to ~** bir kəsi dəfn etmək/basdırmaq; 3. *hərb.* azad durma; 4. hərəkətsizlik, tərpənməzlik; **to bring to ~** dayandırmaq, saxlamaq; *The horses were brought to rest Atları dayandırdılar*; **to come to ~** dayanmaq; *The car rolled down the hill by itself and came to rest at the bottom Maşın təpədən özözünə gilləndi və təpənin ətəyində dayandı*;
◊ **to be at ~ from toil** bütün əzablardan qurtarmaq, ölmək

**rest** [rest] *n* II 1. **(the ~)** qalan; **the ~ of my life**

ömrümün/həyatımın qalanı; **the ~ of his money** onun pulunun qalanı; *Take what you want and throw the rest away Nə istəyirsən/istəyirsiniz götür/götürün, qalanını at/atın getsin; The first question was difficult, but the rest were quite easy Birinci sual çətin, qalanları isə çox asan idi*; **2.** *mal.* **1)** **(the ~)** qalıq, qalan məbləğ; **2)** ehtiyat fondu

**rest²** [rest] *v* I **1.** dincəlmək, istirahət etmək, yorğunluğunu/dincini almaq; *He likes to rest after dinner O, nahardan sonra dincəlməyi/istirahət etməyi xoşlayır; Lie down and rest for an hour after dinner Nahardan sonra uzanıb bir saat dincəl/dincəlin*; **2.** basdırmaq, dəfn etmək; uyumaq; *He rests in the churchyard O, kilsə qəbristanlığında uyuyur*; **3.** istirahət vermək; **to ~ men and horses** adamlara və atlara istirahət vermək; *Dark glasses rest my eyes Qara eynək mənim gözlərimə istirahət verir, Qara eynəkdə mənim gözlərim dincəlir*; **4.** rahatlaşmaq, sakit olmaq; *He couldn't rest till he got his wish İstədiyini əldə etməyincə o sakitləşmədi*; **5.** qoymaq *(bir şeyin üstünə)*; söykəmək; **to ~ *one's* elbow on the table** dirsəyini stolun üstünə qoymaq; **to ~ *one's* head on the pillow** başını balıncın üstünə qoymaq; **6.** dayanmaq; *The roof of the house rests on eight columns Evin damı səkkiz sütun üstündə dayanır*; **7.** **(on, in, upon)** qoymaq *(məsuliyyət və s.)*; **to ~ responsibility on/upon *smb.*** bir kəsin üzərinə məsuliyyət qoymaq; **8.** dəyişmədən qalmaq; *Let the matter rest Qoy/qoyun məsələ belə qalsın*

**rest** [rest] *v* II qalmaq; *This rests a mystery Bu, sirr olaraq qalır*

**restate** [ˈriːˈsteɪt] *v* **1.** yenidən bildirmək/ məlumat/xəbər vermək, yenidən elan etmək; **to ~ *one's* position/commitment** mövqeyini/təəhhüdünü yenidən elan etmək; **2.** yenidən/başqa cür qoymaq; *The question needs to be restated Məsələni başqa cür qoymaq lazımdır*

**restatement** [ˈriːˈsteɪtmənt] *n* **1.** bəyanatı təkrar etmə; **2.** başqa cür qoyma *(məsələni və s.)*

**restaurant** [ˈrestrɔnt] *n* restoran

**restaurateur** [ˌrestərəˈtəːr] *n* restoran sahibi

**restful** [ˈrestfəl] *adj* **1.** sakit, dinc; **~ life** dinc/sakit həyat; **~ spot** sakit yer; **2.** dincəldən, dinclik verən

**restfully** [ˈrestfəlɪ] *adv* sakit, dinc; sakit/ dinc bir tərzdə, sakit-sakit

**restfulness** [ˈrestfəlnɪs] *n* sakitlik, dinclik

**rest-house** [ˈresthaus] *n* istirahət evi

**restitute** [ˈrestɪtjuːt] *v* əvəzini vermək, yerini doldurmaq, ödəmək *(ziyanı və s.)*

**restitution** [ˌrestɪˈtjuːʃn] *n* əvəzini vermə, yerini doldurma, ödəmə, əvəz; **to make ~** ziyanı ödəmək

**restive** [ˈrestɪv] *adj* **1.** harın *(at haq.)*; **2.** tərs, inad; **3.** həyəcanlı, narahat; *Another hour passed and the crowd grew/became restive Daha bir saat da keçdi və kütlə həyəcanlandı /həyəcana gəldi*

**restiveness** [ˈrestɪvnɪs] *n* **1.** harınlıq *(at haq.)*; **2.** tərslik, inadkarlıq; **3.** həyəcanlılıq, narahatlıq

**restless¹** [ˈrestlɪs] *adj* narahat, aramsız; iztirablı; qərarsız; **~ soul** iztirablı/narahat qəlb; *The audience was becoming restless Dinləyicilər narahat olmağa başlayırdılar*; **to be wakeful and ~** narahat yatmaq; **~ eye** həyəcanlı baxış

**restless²** [ˈrestlɪs] *adv* narahat; *She slept very restless O çox narahat yatdı*

**restlessness** [ˈrestlɪsnɪs] *n* narahatlıq; səbirsizlik, hövsələsizlik

**restlessly** [ˈrestlɪslɪ] *adv* narahat, səbirsizliklə, aramsız surətdə; *The lion paced restlessly up and down in its cage Şir qəfəsində aramsız surətdə o yan bu yana addımlayırdı*

**restock** [ˌriːˈstɔk] *v* doldurmaq, yerini doldurmaq; **to ~ the library shelves with new books** kitabxananın rəflərini yeni kitablarla doldurmaq

**restoration** [ˌrestəˈreɪʃn] *n* bərpa etmə, əvvəlki halına salma, bərpa; **~ to health and strength** sağlamlığı və gücü bərpa etmə, sağalma; *The palace is closed during restoration Bərpa edildiyi üçün saray bağlıdır*; **the ~ of a book** kitabın bərpası; *He hopes for restoration to his old job O, köhnə işinə bərpa olunacağına ümid edir/bəsləyir; The restoration of the castle took a year and cost a lot of money Qəsrin bərpası bir il çəkdi və ona xeyli pul xərcləndi*

**restorative¹** [rɪˈstɔːrətɪv] *n* möhkəmləndirici /tonusverici vasitə; *The brandy acted as a restorative Konyak tonusverici vasitə kimi təsir göstərdi*

**restorative²** [rɪˈstɔːrətɪv] *adj* möhkəmləndirici; tonusverici, canlandırıcı; **the ~ powers of sea air** dəniz havasının möhkəmləndirici gücü; **a ~ cup of tea** bir fincan canlandırıcı çay

**restore** [rɪˈstɔːr] *v* **1.** qaytarmaq, geri qaytarmaq; **to ~ *smb.'s* property** bir kəsin əmlakını geri qaytarmaq; **to ~ a borrowed book** müvəqqəti götürülmüş kitabı geri qaytarmaq; **2.** bərpa etmək; **to ~ an employee to his old post** qulluqçunu əvvəlki vəzifəsinə bərpa etmək; **to ~ public order** ictimai asayişi bərpa etmək; **to ~ *smb.'s* health** bir kəsin sağlamlığını bərpa etmək; **to ~ *smb.'s* reputation** bir kəsin şərəfini/şöhrətini bərpa etmək; **to ~ a picture** şəkli/rəsmi bərpa etmək; **3.** dirçəltmək; **to ~ old customs** köhnə adətləri dirçəltmək

**restored** [rɪsˈtɔːd] *adj* bərpa edilmiş; dirçəlmiş, dirçəldilmiş

**restorer** [rɪˈstɔːrər] *n* bərpaçı; bərpa edən; **a picture ~** şəkil/rəsm bərpaçısı; **a furniture ~** mebel bərpa edən *(usta)*

**restrain** [rɪsˈtreɪn] *v* **1.** məhdudlaşdırmaq; **to ~ production** istehsalı məhdudlaşdırmaq; **to ~ *smb.'s* activities** bir kəsin fəaliyyətini məhdudlaşdırmaq; **to ~ power** hakimiyyəti məhdudlaşdırmaq; **2.** saxlamaq, gizlətmək; qarşısını almaq; **to ~ *one's* temper** özünü saxlamaq, hövsələsini basmaq, özündən çıxmamaq; **3.** azadlıqdan məhrum etmək, həbsxanaya salmaq

**restrained** [rɪsˈtreɪnd] *adj* **1.** təmkinli, səbirli, özünü/nəfsini saxlaya bilən; **a ~ protest** təmkinli etiraz; **a ~ discussion** təmkinli/səbirli müzakirə; *He was furious, but his manner was very restrained O, qeyzli/qəzəbli idi, lakin o, təmkinli davrandı*; **2.** mötədil, mülayim; **~ demands** mülayim tələblər; **3.** məhdud, müəyyən; **in ~ terms** məhdud/ müəyyən şərtlərlə

**restraint** [rɪsˈtreɪnt] *n* təmkinlilik, səbirlilik, özünü/nəfsini saxlaya bilmə; təmkin, səbir; *The police appealed to the crowd for restraint Polis camaatı təmkinli/səbirli olmağa çağırdı*

**restrict** [rɪˈstrɪkt] *v* məhdudlaşdırmaq; **to ~ *smb.'s* freedom** bir kəsin azadlığını məhdudlaşdırmaq; *Fog restricted visibility Duman görüntünü məhdudlaşdırdı*; **to ~ the number of students in a class** sinifdə tələbələrin sayını məhdudlaşdırmaq

**restricted** [rɪˈstrɪktɪd] *adj* məhdud, məhdud edilmiş, məhdudlaşdırılmış, dar; **~ diet** məhdudlaşdırılmış pəhriz; **~ war** məhdud müharibə; *The sale of alcohol is restricted in Britain Britaniyada spirtli içkilərin satışı məhdudlaşdırılıb*

**restriction** [rɪˈstrɪkʃn] *n* məhdudiyyət, məhdudlaşdırma; **to impose/to place ~s** məhdudiyyət qoymaq; **to lift ~s** məhdudiyyəti götürmək; **without ~** məhdudiyyət qoymadan, hədsiz dərəcədə; **to drink without ~** hədsiz dərəcədə içmək

**restrictive** [rɪsˈtrɪktɪv] *adj* məhdud, məhdudlaşdırıcı; **~ speed** məhdud sürət; **~ condition** məhdudlaşdırıcı şərt; **~ particles** *qram.* məhdudlaşdırıcı ədatlar

**rest-room** [ˈrestrum] *n* **1.** istirahət otağı; **2.** *amer.* rahatxana, ayaqyolu

**result¹** [rɪˈzʌlt] *n* **1.** nəticə; **to obtain good ~s** yaxşı nəticələr əldə etmək; **to yield ~s** nəticələr vermək; *The work led to no result İş heç bir nəticə vermədi*; **to give out ~s of the competitions** yarışların nəticələrini elan etmək; *What was the result of the competition? Yarışın nəticəsi nə oldu?*; **without ~** nəticəsiz olaraq; **as a ~ of ……** nəticəsində; *She died as a result of her injuries O, yaralarına görə öldü*; **in the ~** nəhayətdə, sonda; **2.** *riyaz.* cavab

**result²** [rɪˈzʌlt] *v* **1.** **(from)** nəticə vermək/çıxmaq; *Nothing has resulted from my efforts Mənim səylərim/ cəhdlərim heç bir nəticə vermədi*; **2.** **(in)** nəticələnmək, qurtarmaq; *Heavy rains resulted in floods Güclü yağışlar daşqınlarla nəticələndi*; **to ~ in a win** *id.* qələbə ilə nəticələnmək/ qurtarmaq

**resultant** [rɪˈzʌltənt] *adj* meydana çıxan/ gələn; **the growing economic crisis and ~ unemployment** artmaqda olan iqtisadi böhran və meydana gələn işsizlik

**resume** [rɪˈzjuːm] *v* **1.** yenidən başlamaq, bərpa etmək, təzələmək; davam etdirmək; **to ~ work** işi yenidən başlamaq/davam etdirmək; **to ~ a game** *id.* oyunu yenidən başlamaq/davam etdirmək; **to ~ fire** *hərb.* atəşi təzələmək, yenidən atəş açmaq; **2.** geri almaq/götürmək, yenidən sahib olmaq; *He resumed his seat O yenidən öz yerində oturdu*; **to ~ a territory** tutulmuş/zəbt edilmiş ərazini geri qaytarmaq; **3.** xülasə etmək, yekun vurmaq, yekunlaşdırmaq; **a book which ~s all his views** onun bütün baxışlarını yekunlaşdıran kitab

**resume** [ˈrezjumeɪ] *n* xülasə, nəticə; **to give a ~ of the meeting** iclas haqqında xülasə vermək

**resumption** [rɪˈzʌmpʃn] *n* **1.** yenidən başlama/ başlanma, təzələmə; **a ~ of hostilities /negotiations/diplomatic relations** ədavətlərin/danışıqların/ diplomatik əlaqələrin yenidən başlanması; **2.** geri alma/ qaytarma

**resurgence** [rɪˈsəːdʒəns] *n* yenidən törəmə, canlanma, dirçəldilmə, dirçəlmə; bərpa, yüksəliş

**resurgent** [rɪˈsəːdʒənt] *adj* dirçələn, canlanan, oyanan; **a ~ economy** canlanan/ dirçələn iqtisadiyyat; **~ hope** canlanan/ oyanan ümid; **~ nationalism** dirçələn/ oyanan millətçilik

**resurrect** [ˌrezəˈrekt] *v* **1.** dirçəltmək, canlandırmaq; bərpa etmək; **to ~ old customs/traditions** köhnə ənənələri/ adətləri dirçəltmək; **to ~ recollections** xatirələri canlandırmaq; *Slavery can't be resurrected Quldarlıq bərpa edilə bilməz*; **2.** diriltmək; *That noise is enough to resurrect the dead! Bu səs-küy ölüləri belə diriltər!*

**resurrection** [ˌrezəˈrekʃn] *n* **1.** dirilmə *(ölülər haq.)*; **the Resurrection** *din.* İsanın dirilməsi; **2.** qiyamət günündə bütün ölülərin dirilməsi; **3.** dirçəlmə, oyanma; **~ of hope** ümidin dirçəlməsi; **the ~ of German militarism** alman militarizminin dirçəlməsi; **4.** bərpa, bərpa olunma; **~ to health** sağlamlığın bərpa olunması; **5.** meyiti qazıb çıxartma *(müayinə etmək üçün)*

**resuscitate** [rɪˈsʌsɪteɪt] *v* **1.** diriltmək; canlandırmaq, həyata qaytarmaq, ayıltmaq, ağlını başına gətirmək; **to ~ a child pulled from the water** sudan çıxarılmış uşağı həyata qaytarmaq/ ayıltmaq; *He was resuscitated Onu həyata qaytardılar*; **2.** ayılmaq, dirilmək, ağlı başına gəlmək

**resuscitation** [rɪˈsʌsɪteɪʃn] *n* canlandırma, canlanma; diriltmə, dirilmə, həyata qayıtma, huşa gətirmə/gəlmə

**retail¹** [ˈriːteɪl] *n* pərakəndə satış; **to sell by ~** pərakəndə halda satmaq

**retail²** [ˈriːteɪl] *adj* pərakəndə; **~ price** pərakəndə satış qiyməti

**retail³** [ˈriːteɪl] *v* **1.** satmaq; pərakəndə halda satmaq; **2.** yenidən danışmaq, təkrar etmək, gəzdirmək; **to ~ gossip** qeybət/dedi-qodu gəzdirmək

**retailer** [ˈri:teɪlə^r] *n* 1. pərakəndə halda satan; dükançı; 2. sözgəzdirən, qeybətçi, dedi-qoduçu

**retain** [rɪˈteɪn] *v* 1. saxlamaq, qorumaq, qoruyub saxlamaq; mühafizə etmək; **to ~ *one's* freedom/independence** azadlığını /müstəqilliyini qorumaq; **to ~ the use of *one's* faculties** öz qabiliyyətlərini saxlamaq; *He still retains his sight O hələ yaxşı görür; The hills, the forests and the rivers still retain their old Celtic names Təpələr, meşələr və çaylar özlərinin qədim kelt adlarını hələ də saxlayır/ qoruyub saxlayır;* **to ~ the power** hakimiyyəti saxlamaq/qorumaq; 2. yadda saxlamaq, xatırlamaq; *I can't retain these distinctions Mən bu fərqləri yadda saxlaya bilmirəm;* 3. dəvət etmək, tutmaq *(tərbiyəçi, vəkil və s.);* **to ~ a barrister/ a consultant** vəkil/məsləhətçi tutmaq

**retainer** [rɪˈteɪnə^r] *n* 1. xidmətçi, nökər; 2. vəkilə əvvəlcədən verilmiş qonorar; 3. *tex.* ştopor *(mexanizmin hərəkət edən hissələrini dayandırmaq və bu vəziyyətdə saxlamaq üçün qurğu)*

**retaining** [rɪˈteɪnɪŋ] *adj* 1. saxlayan, tutub saxlayan; **a ~ screw** saxlayan vint; 2. *tex.* dayaq; **a ~ wall** dayaq divar

**retake¹** [ˌri:ˈteɪk] *n* 1. yenidən/təkrarən çəkmə *(kino, foto);* 2. təkrarən imtahan vermə

**retake²** [ˌri:ˈteɪk] *v* (*pt* **retook** [-ˈtuk]; *pp* **retaken** [-ˈteɪkn]) 1. yenidən almaq/ələ keçirmək; **to ~ a town** şəhəri yenidən almaq/ələ keçirmək; 2. yenidən imtahan götürmək; **to ~ physics paper** fizikadan yenidən imtahan bileti götürmək; **to ~ the kick** zərbəni təkrar etmək *(futbol oyununda);* 3. yenidən çəkmək *(foto, kino)*

**retaken** [ˌri:ˈteɪkn] **to retake** *felinin pp forması*

**retaliate** [rɪˈtælɪeɪt] *v* əvəzini çıxmaq/vermək; qisas /intiqam almaq; **to ~ upon the enemy** düşməndən qisas/intiqam almaq; **to ~ an insult** təhqirə cavab vermək; *Tom kicked Jane, and Jane retaliated (against him) by biting Tom Ceyni təpiklə vurdu, Ceyn əvəzində onu dişlədi*

**retaliation** [rɪˌtælɪˈeɪʃn] *n* 1. əvəzini/haqqını vermə, ödəmə; cəza; **massive ~** *hərb.* iri-həcmli cavab hücumu; **in ~** cavab olaraq; 2. təzyiq/cəza tədbirləri

**retaliatory** [rɪˈtælɪətrɪ] *adj* cavab; **~ blow** cavab zərbəsi; **to take ~ measures** cavab tədbirləri görmək

**retard¹** [rɪˈta:d] *n* geri qalma, gerilik; ləngimə, yubanma, gecikmə; **to be in ~** geridə/dalda qalmaq

**retard²** [rɪˈta:d] *v* 1. yubatmaq, gecikdirmək, ləngitmək; *Cold weather retards the growth of the crop Soyuq hava məhsulun yetişməsini ləngidir/gecikdirir/yubadır;* 2. yubanmaq, gecikmək, ləngimək

**retardation** [ˌri:ta:ˈdeɪʃn] *n* 1. yubanma, ləngimə, gecikmə; yavaşıma, sürəti azaltma; 2. əqli inkişafın ləngiməsi/gecikməsi/yubanması; 3. manеə, çətinlik

**retarded** [rɪˈta:dɪd] *adj* geri/dala qalmış; **a ~ child** əqli cəhətdən geri qalmış uşaq

**retch¹** [retʃ] *n* öyümə

**retch²** [retʃ] *v* öyümək; *It makes me retch Bu məni öyüdür; She retched at the smell and hurried to open a window O, iydən öyüdü və pəncərəni açmağa tələsdi*

**retell** [ˌri:ˈtel] *v* (*pt, pp* **retold**) 1. təkrar danışmaq, yenidən nağıl etmək; 2. işləmək, asanlaşdırmaq *(hekayəni və s.); He has retold Greek myths for children O, yunan əsatirlərini uşaqlar üçün işləyib*

**retention** [rɪˈtenʃn] *n* 1. saxlama; qoruma, qoruyub saxlama; **the ~ of power** hakimiyyəti qoruyub saxlama; **~ of snow** *k.t.* qarı tarlada saxlama *(süni yolla);* 2. yaddaş, yadda saxlama qabiliyyəti; 3. *tib.* gecikmə, ləngimə, yubanma; 4. *hərb.* əlavə hərbi xidmətdə saxlama müddəti

**retentive** [rɪˈtentɪv] *adj* 1. saxlayan, buraxmayan; **~ soil** su buraxmayan/nəm saxlayan torpaq; 2. yaxşı, möhkəm *(yaddaş haq.);* yaxşı/möhkəm yaddaşı olan

**rethink** [ˌri:ˈθɪŋk] *v* (*pt, pp* **rethought** [-ˈθɔ:t]) yenidən fikirləşmək *(münasibətini və s. dəyişmək məqsədilə);* **to ~ a strategy/an approach /attitude** strategiyanı/ yanaşmanı/münasibəti dəyişmək üçün yenidən fikirləşmək

**reticence** [ˈretɪsns] *n* 1. dinməzlik, danışmazlıq, sakitlik; sirr verməzlik, niyyət və duyğularını gizli saxlama; 2. təmkinlilik, səbirlilik, özünü /nəfsini saxlaya bilmə, təmkin, səbir; *She overcame her natural reticence and talked freely about her marriage O təbiətən ona xas təmkinliliyə qalib gəldi və evlənməsi haqda sərbəst danışdı*

**reticent** [ˈretɪsnt] *adj* 1. dinməz, danışmaz, sakit; **to be very ~ about/on *smth.*** bir şeyi gizləmək, bir şey haqqında danışmamaq; 2. təmkinli, səbirli, özünü/nəfsini saxlaya bilən

**reticule** [ˈretɪkju:l] *n* ridikül *(qadın əl çantası)*

**retire** [rɪˈtaɪə^r] *v* 1. getmək, uzaqlaşmaq; **to ~ from the room** otaqdan çıxıb getmək; 2. itmək, yox/qeyb olmaq; **to ~ from sight** gözdən itmək; *As science advances, superstition retires Elm inkişaf etdikcə, xurafat/mövhumat yox olur;* 3. yatmaq; **to ~ to bed** yatmağa getmək; **to ~ to rest** dincəlmək; *We soon retired Biz tezliklə uzanıb yatdıq;* 4. *hərb.* geri çəkmək *(ordunu və s.); The French retired their heavy guns Fransızlar ağır artilleriyalarını geri çəkdilər;* 5. vəzifəni tərk etmək, vəzifədən çıxmaq/getmək; istefaya çıxmaq/getmək, istefa vermək; **to ~ on a pension** təqaüdə çıxmaq/getmək; 6. tənha bir yerə çəkilmək, adamlardan qaçmaq/uzaqlaşmaq, xəlvətə çəkilmək; **to ~ from the world** dünyanı tərk etmək, rəhmətə getmək

**retired** [rɪˈtaɪəd] *adj* 1. istefaya çıxmış/ getmiş, işdən çıxmış; **a ~ officer** istefaya çıxmış zabit; 2.



tənha, yalqız, tək-tənha, uzaq, xəlvət; **a ~ life** tənha/yalqız həyat; **a ~ village** uzaq/tənha kənd

**retirement¹** [rɪˈtaɪəmənt] *n* 1. istefa; istefaya/təqaüdə /istefaya çıxma; **the age of ~** təqaüdə çıxma yaşı; 2. təklik, tənhalıq, yalqızlıq; **~ from the world** dünyadan uzaqlaşma, guşənişinlik

**retirement²** [rɪˈtaɪəmənt] *adj* istefa, təqaüd; **~ age** istefa/təqaüd yaşı; **to be above/ below ~ age** təqaüd yaşından artıq/aşağı olmaq

**retook** [ˈri:ˈtuk] **to retake** *felinin pt forması*

**retort¹** [rɪˈtɔ:t] *n* etiraz; sərt/kobud/kəskin cavab; **a ~ against the new demand** yeni tələbə qarşı etiraz; **to make an insolent ~** sərt/kobud cavab vermək; **in ~** cavab olaraq

**retort²** [rɪˈtɔ:t] *v* 1. kəskin və ağıllı cavab vermək; *She retorted "Nonsense!" "Cəfəngiyyat!" deyə o, sərt cavab verdi;* 2. kobudluğa kobudluqla cavab vermək; 3. təkzib etmək, yalana çıxartmaq; **to ~ a charge** ittihamı təkzib etmək

**retouch¹** [ˌrɪˈtʌtʃ] *n* retuş, retuşlama, retuşla düzəltmə *(fotoqrafiya neqativlərini və ya şəkilləri)*

**retouch²** [ˌrɪˈtʌtʃ] *v* 1. retuş etmək, tuşla düzəltmək *(fotoqrafiya neqativlərini və ya şəkilləri);* 2. boyamaq *(saçı, kirpikləri)*

**retrace** [rɪˈtreɪs] *v* 1. qayıtmaq *(keçilmiş yolla);* **to ~ *one's* steps** geri qayıtmaq; *We retraced our steps to the car and continued our journey Biz maşına qayıtdıq və səyahətlərimizi davam etdirdik;* 2. bərpa etmək; yadına salmaq; *We retraced the details of our trip Biz səyahətimizin təfərrüatını xatırladıq/yada saldıq;* 3. izləmək *(inkişaf prosesini);* **to ~ the etymology** etimologiyanı izləmək; **to ~ the history of the case** işin tarixini izləmək

**retract** [rɪˈtrækt] *v* 1. yığmaq; **to ~ the wheels of an aircraft** təyyarənin təkərlərini yığmaq; *A cat can retract its claws, but a dog cannot Pişik caynaqlarını yığa bilir, lakin it yox;* 2. geri götürmək *(sözü, vədi və s.),* imtina etmək; **to ~ a statement** bəyanatından imtina etmək; *The permission has been given and can't be retracted İcazə verilib və onu geri götürmək olmaz*

**retractable** [rɪˈtræktəbl] *adj* 1. yığıla bilən *(xüs. təyyarənin təkərləri haq.);* **an aircraft with ~ wheels** təkərləri yığıla bilən təyyarə; 2. geri götürülə/imtina oluna bilən *(vəd, ərizə, təklif və s. haq.)*

**retraction** [rɪˈtrækʃn] *n* öz sözündən qaçma/dönmə, sözünü/vədini geri götürmə; *His retraction is very complete O, sözünü tamamilə geri götürür*

**retrain** [ˌri:ˈtreɪn] *v* yenidən hazırlamaq, təkmilləşdirmək; *She retrained as a primary school teacher O, ibtidai məktəb müəllimi kimi təkmilləşdi*

**retraining¹** [ˌri:ˈtreɪnɪŋ] *n* yenidən hazırlama, təkmilləşdirmə, təkmilləşdirilmə

**retraining²** [ˌri:ˈtreɪnɪŋ] *adj* təkmilləşdirmə; **a ~ course** təkmilləşdirmə kursu; **to go on a ~ course** təkmilləşdirmə kursuna getmək

**retread** [ˈri:tred] *n* 1. təzə şin *(avtomobil, təyyarə üçün);* 2. rezindən təzə üzlənmiş/üz çəkilmiş şin

**retreat¹** [rɪˈtri:t] *n* 1. uzaqlaşma, geri çəkilmə, çəkilmə; **~ from reality** həqiqətdən uzaqlaşma /kənara çıxma; 2. *hərb.* geri çəkilmə haqqında siqnal; 3. sığınacaq, daldalanacaq *(yer);* 4. yuva, yataq; *The robbers had their retreat among the hills Dağların arasında quldurların yuvası var idi;* 5. təklik, tənhalıq, yalqızlıq; tənha yer; **a ~ from public life** ictimai həyatdan uzaqlaşma

**retreat²** [rɪˈtri:t] *v* 1. geri çəkilmək; *The army retreated Ordu geri çəkildi;* 2. getmək; *He retreated to his room O, otağına getdi/çəkildi*

**retrench** [rɪˈtrentʃ] *v* 1. ixtisar etmək, ixtisara salmaq, azaltmaq, əskiltmək; **to ~ expenditure** xərcləri azaltmaq; 2. qənaət etmək

**retrenchment** [rɪˈtrentʃmənt] *n* 1. xərcləri azaltma/ixtisar etmə; 2. qısaltma *(mətni)*

**retrial** [ˈri:ˈtraɪəl] *n* işə yenidən baxma; *The judge ordered a retrial because new evidence had come to light Yeni sübutların aşkar olması ilə bağlı olaraq hakim işə yenidən baxılması haqqında sərəncam verdi*

**retribution** [ˌretrɪˈbju:ʃn] *n* 1. cəza, tənbeh; **the Day of ~** qiyamət günü; 2. əvəz vermə; **~ of evil for evil** pisliyə pisliklə cavab vermə

**retrieve** [rɪˈtri:v] *v* 1. geri qaytarmaq/ almaq; **to ~ the purchase money** bir şey almaq üçün verilmiş pulu geri almaq; *I went to retrieve my umbrella Mən çətirimi geri almaq üçün getdim;* 2. bərpa etmək, əvvəlki vəziyyətə qaytarmaq; **to ~ *one's* fortune** var-dövlətini bərpa etmək; 3. düzəltmək; **to ~ a mistake** səhvi düzəltmək; 4. xilas etmək, qurtarmaq; **to ~ *smb.* from death** bir kəsi ölümdən qurtarmaq/xilas etmək

**retriever** [rɪˈtri:və^r] *n* ov iti

**return¹** [rɪˈtə:n] *n* 1. qayıtma, geri dönmə; **a ~ home** evə/vətənə qayıtma; **the ~ of spring** yazın/baharın qayıtması; 2. qaytarma; *He asked for the return of his book O, kitabının qaytarılmasını xahiş etdi;* **in ~** əvəzində, yerinə; 3. *iqt.* dövriyyə, tədavül; 4. gəlir, mənfəət; **gross ~** ümumi gəlir *(xərci çıxılmamış);* **to bring (in) a fair ~** yaxşı gəlir gətirmək/mənfəət vermək;

◊ *Many happy returns (of the year)* ≅ *Ad gününü/günününüzü təbrik edirəm*

**return²** [rɪˈtə:n] *v* 1. qayıtmaq, geri dönmək; **to ~ home** evə qayıtmaq; *They returned to Baki from Istanbul Onlar İstanbuldan Bakıya qayıtdılar; What time does his father return from work? Onun atası işdən nə vaxt qayıdır?* 2. qaytarmaq, geri vermək; **to ~ a book to the library** kitabı kitabxanaya qaytarmaq; *When will you return (me) my book? Mənim kitabımı*

*nə vaxt qaytaracaqsan/ qaytaracaqsınız?*; 3. cavab vermək; **to ~ *smb.*'s greeting** bir kəsin salamına cavab vermək; **to ~ good for evil** pisliyə yaxşılıqla cavab vermək; 4. qoymaq, yerinə qoymaq; **to ~ sword to scabbard** qılıncı qınına qoymaq; *He returned his handkerchief to his pocket O, əl yaylığını cibinə qoydu;* 5. rəsmi olaraq bildirmək/ məlumat vermək; **to ~ *one's* income** gəliri/qazancı haqqında rəsmi olaraq məlumat vermək; 6. vermək; **to ~ answer** cavab vermək; 7. *iqt.* qazanc vermək/gətirmək; **to ~ good interest** yaxşı qazanc gətirmək; 8. *fiz.* əks etdirmək *(işığı, səsi)*;
◊ **to ~ thanks** 1) təşəkkür etmək; 2) dua oxumaq *(yeməkdən əvvəl və ya sonra)*; 3) tosta cavab vermək

**returnable** [rı'tə:nəbl] *adj* qaytarıla bilən, qaytarılması mümkün olan; **~ bottles** qaytarıla bilən butulkalar; *Hats are not returnable Şlyapalar geri götürülmür/qaytarılmır (xəbərdarlıq)*;

**returned** [rı'tə:nd] *adj* 1. qayıtmış, qaytarılmış; **~ letters** qaytarılmış/ qayıtmış məktublar; **a ~ traveller** qayıtmış səyahətçi; 2. seçilmiş *(parlamentə)*

**returnee** [ˌrıtə:'ni:] *n* 1. qayıdan, geri dönən *(sürgündən, xaricdən və s.)*; 2. həqiqi xidmətə çağırılan *(ehtiyatdan)*

**return-ticket** [rı'tə:n'tıkıt] *n* ikibaşa bilet

**re-type** [ˌri'taıp] *v* yenidən çap etmək *(makinada)*

**reunification** ['ri'ju:nıfı'keıʃn] *n* yenidən birləşmə/birləşdirilmə/birləşdirmə

**reunify** ['ri:'ju:nıfaı] *v* yenidən birləşdirmək

**reunion** ['ri:'ju:njən] *n* 1. birləşmə; barışma; 2. dostların görüşü; axşam qonaqlığı, əyləncə gecəsi; **a college ~** köhnə həmfikirlərin görüşü

**reunite** ['ri:ju:'naıt] *v* yenidən birləşmək; *This issue at last reunited the Tory Party Bu məsələ nəhayət Tori partiyasını yenidən birləşdirdi*

**reusable** [ˌri:'ju:zəbl] *adj* yenidən istifadə edilə bilən, yenidən istifadəyə yararlı; **a ~ envelope** yenidən istifadəyə yararlı zərf

**reuse** [ˌri:'ju:z] *v* yenidən istifadə etmək; **to ~ an old envelope** köhnə zərfdən yenidən istifadə etmək

**reveal** [rı'vi:l] *v* 1. açmaq, aşkarlamaq, aşkar etmək; **to ~ a secret** sirri açmaq; **to ~ *one's* soul to *smb.*** qəlbini/ürəyini bir kəsə açmaq; *She suddenly revealed (the fact) that she was not married O qəfildən aşkarladı ki, o, ərdə deyil*; 2. göstərmək, görünmək; *He turned so that his face was revealed O döndü ki, biz onun üzünü görək*

**revel**[1] ['revl] *n* şadlıq, şənlik; əyləncə, kef, eyş-işrət, içki məclisi, əyyaşlıq

**revel**[2] ['revl] *v* (-ll-) 1. kef/bayram etmək, vaxtını kefdə/əyyaşlıqda keçirmək; 2. həzz almaq *(bir şeydən)*; **to ~ in *smth.*** bir şeydən həzz almaq; **to ~ in a book** kitabdan ləzzət/həzz almaq

**revelation** [ˌrevı'leıʃn] *n* 1. açma, aşkarlama *(sirri və s.)*; ifşa, ifşa etmə; 2. *din.* vəhy

**revenge**[1] [rı'vendʒ] *n* qisas, intiqam; qisas/intiqam alma arzusu; **to have/to take *one's* ~ upon *smb.* for *smth.*** bir kəsdən bir şeyə görə qisas/intiqam almaq; **to feed *one's* ~** intiqam/qisas alma həsrəti/arzusu ilə yaşamaq; **to have *one's* ~** qisas almağa çalışmaq; *There was revenge in his heart O, intiqam/qisas almaq arzusu ilə yaşayırdı*

**revenge**[2] [rı'vendʒ] *v* qisas/intiqam almaq; **to ~ *smb.*'s death** bir kəsin ölümü üçün qisas almaq; **to ~ an injustice** ədalətsizliyə görə intiqam /qisas almaq

**revengeful** [rı'vendʒfl] *adj* intiqamçı, kinli, kin saxlayan, qisasçı

**revenue** ['revınju:] *n* 1. gəlir; mədaxil; 2. *pl* gəlir mənbəyi; **the ~s of the city council** şəhər şurasının gəlir mənbəyi

**reverberate** [rı'və:bəreıt] *v* 1. *fiz.* əks etdirmək; **to ~ sound/light/heat** səsi/işığı/istiliyi əks etdirmək; 2. əks olunmaq

**reverberation** [rıˌvə:bə'reıʃn] *n* 1. *fiz.* əks etmə, inikas; **~ of rays from a surface** səthdən şüaların əks etməsi; 2. əks-səda; **the ~ of voices** səslərin əks-sədası; 3. gurultu; **the ~ of thunder** ildırımın gurultusu

**revere** [rı'vıə^r] *v* dərin hörmət etmək/ bəsləmək, sitayiş etmək

**revered** [rı'vıəd] *adj* hörmətli, hörmətəlayiq; **her ~ father** onun hörmətli/ hörmətəlayiq atası; **a teacher ~ by the students** tələbələr tərəfindən hörmət edilən müəllim

**reverence**[1] ['revərəns] *n* dərin məhəbbət/ ehtiram; **~ for *smth.*** bir şeyə dərin məhəbbət/ehtiram; **to hold *smb.* in ~, to regard *smb.* with ~** bir kəsə dərin hörmət etmək/ehtiram göstərmək

**reverence**[2] ['revərəns] *v* dərin hörmət bəsləmək; **to ~ the law** qanuna hörmət etmək

**reverent** ['revərənt] *adj* hörmətli, hörmətə/ ehtirama layiq; **~ words** hörmətə layiq sözlər

**reverie** ['revərı] *n* xəyal, arzu; xəyal/arzu etmə; **to indulge in ~** xəyala dalmaq

**reverse**[1] [rı'və:s] *n* 1. əkslik, zidlik; **quite the ~** tam zidlik; **the ~ of what we expected** bizim gözlədiyimizin əksi/ ziddi; 2. əks tərəf *(medalda, sikkədə)*; **~ of a coin** reşka *(metal pulun gerb olmayan tərəfi)*; 3. məğlubiyyət, uğursuzluq; **to suffer/to meet with a ~** uğursuzluğa düçar olmaq;
◊ **in ~** 1) əksinə; 2) arxadan; **to take the enemy in ~** düşmənə arxadan hücum etmək

**reverse**[2] [rı'və:s] *adj* 1. əks, zidd; geri, tərs; döndərilmiş, çevrilmiş; **the ~ side** əks/ tərs tərəf; **in ~ order** tərsinə, əksinə; **by the ~ method** tam əks metodla/üsulla; 2. tərs üzü *(paltar haq.)*; **the ~ side of the cloth** paltarın tərs üz/tərəfi; **~ movement** əks tərəfə hərəkət; 3. arxada/ dalda yerləşdirilmiş; 4. *hərb.* dal/arxa tərəfdən olan; **~ fire** arxadan atəş



**reverse**[3] [rı'və:s] *v* 1. tam əks tərəfə döndərmək; tam dəyişmək; **to ~ the normal order** adi qaydadan tam dəyişmək; **to ~ a policy** siyasəti kəskin surətdə dəyişmək; 2. geri döndərmək, geri hərəkət etdirmək *(mühərriki)*; 3. *hüq.* ləğv etmək; **to ~ a sentence** hökmü ləğv etmək; **to ~ the decision of a lower court** daha aşağı pilləli məhkəmənin qərarını ləğv etmək

**reversible**[1] [rı'və:səbl] *n* 1. ikiüzlü material /parça; 2. ikiüzlü parçadan tikilmiş kostyum /paltar

**reversible**[2] [rı'və:səbl] *adj* 1. dönən, dönmə qabiliyyətinə malik olan; **~ process/ reaction** dönən proses/reaksiya; 2. ikiüzlü *(parça haq.)*; **a ~ coat/pillowcase** ikiüzlü parçadan tikilmiş palto/balışüzü; 3. *hüq.* ləğv oluna bilən, şikayət verilə bilən, qərarın ləğv olunmasına əsas verə bilən

**reversion** [rı'və:ʃn] *n* 1. yerdəyişmə, sırasını əks istiqamətdə dəyişmə; 2. qaytarma, əvvəlki vəziyyətə qayıtma; **the ~ of Hong Kong to China** Honq Konqu Çinə qaytarma; 3. *tex.* reversiya *(maşının hərəkət istiqamətini dəyişmə/ əksinə hərləmə)*; 4. *hüq.* reversiya *(əmlakı əvvəlki sahibinə qaytarma)*; 5. ölümdən sonra verilən sığorta

**revert** [rı'və:t] *v* 1. qayıtmaq, geri dönmək *(əvvəlki vəziyyətə)*; *The fields have reverted to moorland Çölləri yenidən süpürgə kolu/yovşan basıb*; 2. dönmək, qayıtmaq *(əvvəlki fikrə/mövzuya)*; **to ~ to the point one started from** başladığı nöqtəyə qayıtmaq; **to ~ to a custom** köhnə adəti dirçəltmək; 3. *hüq.* əvvəlki sahibinə verilmək

**revest** ['ri:'vest] *v* bərpa etmək/edilmək; *The title revested in him Onun əvvəlki titulunu özünə qaytardılar*

**revetment** [rı'vetmənt] *n* *tik.* üz çəkmə; haşiyə tikmə/vurma; köbələmə, haşiyə, köbə

**review**[1] [rı'vju:] *n* 1. baxma, gözdən keçirmə; müzakirəyə qoyma; **in/under ~** baxılan, müzakirəyə qoyulan; **to come under ~** baxılmaq, müzakirəyə qoyulmaq; **to take a ~ of the war** müharibənin əsas hadisələrini müzakirə etmək; 2. resenziya, tənqidi xülasə/icmal; 3. dövri jurnal/nəşr; **scientific ~** elmi jurnal; **weekly ~** həftəlik nəşr; **to edit/to conduct a ~** jurnal nəşr etmək; 4. *hərb.* parad, baxış; **a ~ of the troops** qoşunların paradı, qoşuna baxış; **to march/to pass in ~** təntənəli marşla yerimək/keçmək; 5. *hüq.* yenidən mühakimə etmə/edilmə; **court of ~** kassasiya məhkəməsi

**review**[2] [rı'vju:] *v* 1. baxmaq, gözdən keçirmək, nəzər salmaq *(bir şeyə)*, yada salmaq; **to ~ the past** keçmişi yada salmaq/xatırlamaq; **to ~ the situation** vəziyyəti təhlil etmək; 2. təkrar etmək *(keçilmiş materialı)*; 3. resenziya/tənqidi rəy/xülasə yazmaq *(əsər, tamaşa və s. haq.)*; **to ~ a book** kitaba resenziya/ tənqidi rəy yazmaq; 4. *hərb.* parad qəbul etmək; **to ~ troops** qoşun paradı qəbul etmək

**reviewer** [rı'vju:ə^r] *n* resenzent, icmalçı, icmal/resenziya yazan, tənqidçi

**revile** [rı'vaıl] *v* *(xüs. məchulda işlənir)* təhqir etmək, danlamaq, yamanlamaq, abrını almaq

**revise**[1] [rı'vaız] *n* yoxlama, gözdən keçirmə

**revise**[2] [rı'vaız] *v* 1. yoxlamaq, baxmaq, gözdən keçirmək; düzəltmək, təshih etmək; **to ~ a manuscript before publication** nəşrdən əvvəl əlyazmasını yoxlamaq/təshih etmək; **to ~ a document** sənədi yoxlamaq, sənədə baxmaq; 2. yenidən işləmək; **to ~ a book** kitabı yenidən işləmək; 3. nəzərdən keçirmək, dəyişmək; **to ~ *one's* opinion of *smb.*** bir kəs haqqında fikirlərini dəyişmək; 4. təkrar etmək; **to ~ for an examination** imtahan üçün təkrar etmək

**revised** [rı'vaızd] *adj* yoxlanılmış, düzəldilmiş, təshih edilmiş, yenidən işlənmiş; **~ edition** yenidən işlənmiş/ təshih edilmiş nəşr

**reviser** [rı'vaızə^r] *n* *poliqr.* yoxlayıcı korrektor

**revision** [rı'və:ʃn, rı'və:ʒn] *n* 1. yoxlama, gözdən/nəzərdən keçirmə; təshih etmə, düzəltmə; 2. yenidən işləmə *(kitabı)*; 3. nəşri gözdən keçirmə və təshih etmə; 4. təftiş, təftiş etmə/edilmə; yoxlanış

**revisionism** [rı'vıʒənızm] *n* *siya.* revizionizm, təftişçilik

**revisionist** [rı'vıʒənıst] *n* 1. *siya.* revizionist, təftişçi; 2. təftiş etmə tərəfdarı, təftiş tələb edən *(adam)*

**revival** [rı'vaıvl] *n* 1. dirçəliş, dirçəlmə, bərpa olunma; **a religious/political ~** dini/siyasi dirçəliş; **a ~ of traditions** ənənələrin dirçəldilməsi/bərpa olunması; **~ of Gothic architecture** qot memarlığının dirçəldilməsi/bərpa olunması; *Our economy is undergoing a revival Bizim iqtisadiyyatımız dirçəlir*; 2. oyanma, oyanış; oyatma, oyandırma, canlanma, canlandırma; **the ~ of a whole continent** bütün bir qitənin oyanışı/ canlanması; 3. yenidən meydana gəlmə/ göstərilmə *(film, pyes haq.)*

**revive** [rı'vaıv] *v* 1. dirilmək, dirçəltmək, dirçəlmək, yenidən canlanmaq, təzədən meydana çıxmaq; inkişaf/tərəqqi etmək; cana gətirmək/gəlmək; **to ~ an old custom** qədim adəti dirçəltmək; *That rose will revive if you water it Sulasan/Sulasanız o gül yenidən dirçələcək/cana gələcək; The fresh air soon revived him Təzə hava onu tezliklə dirçəltdi/cana gətirdi*; 2. huşu başına gəlmək, ayılmaq; **to ~ after a fainting fit** özündən getdikdən sonra özünə gəlmək/ayılmaq; 3. oyatmaq, doğurmaq; **to ~ an interest** maraq oyatmaq/ doğurmaq; 4. yenidən qüvvəyə minmək *(qanun və s. haq.)*; 5. yenidən tamaşaya qoymaq *(pyesi)*; 6. bərpa etmək *(quruluşu, rejimi)*

**revivify** [ri:'vıvıfaı] *v* *(pt, pp* **-fied***)* diriltmək, dirçəltmək, canlandırmaq, can vermək, cana gətirmək

**revocation** [ˌrevəˈkeɪʃn] *n* ləğv etmə/ edilmə; **the ~ of the contract** müqaviləni ləğv etmə, müqavilənin ləğv edilməsi

**revoke** [rɪˈvouk] *v* ləğv etmək *(qanunu, kontraktı və s.)*; **to ~ a driving licence** sürücülük vəsiqəsini əlindən almaq/ləğv etmək

**revolt**[1] [rɪˈvoult] *n* **1.** üsyan, qiyam, iğtişaş; **armed ~** silahlı üsyan/qiyam; **to rise/to break out/in ~** üsyan/qiyam qaldırmaq; **to rouse/to stir up the people to ~** adamları üsyana/qiyama qaldırmaq; **to repress/to put down a ~** qiyamı/üsyanı yatırmaq; **2.** protest, etiraz; **a ~ against image worship** bütpərəstliyə qarşı protest/etiraz; **3.** nümayişkaranə çıxma/tərk etmə *(partiyanı və s.)*; **~ from a party** partiyadan nümayişkaranə çıxma

**revolt**[2] [rɪˈvoult] *v* **1.** üsyan etmək, qiyam qaldırmaq; **to ~ against** ***smb.*** bir kəsə qarşı üsyan etmək/qiyam qaldırmaq; **2.** zidd/əks olmaq, müqavimət göstərmək, qarşı durmaq; nifrət bəsləmək; *His nature revolts at/against deceit Yalan onda nifrət oyadır; The scene revolted him Bu səhnə onda nifrət oyatdı*

**revolting** [rɪˈvoultɪŋ] *adj* üfunətli, iyrənc, nifrət doğuran, çox pis; **a ~ smell of bad eggs** xarab olmuş yumurtaların iyrənc/üfunətli iyi; *His feet smell absolutely revolting Onun ayaqları üfunət iylənir*

**revoltingly** [rɪˈvoultɪŋlɪ] *adv* iyrənc tərzdə, çox pis; *His socks are revoltingly dirty Onun corabları iyrənc tərzdə çirklidir*

**revolution** [ˌrevəˈlu:ʃn] *n* **1.** inqilab; **bourgeois /socialist ~** burjua/sosialist inqilabı; **French Revolution of 1789** 1789-cu il Fransa inqilabı; **a peaceful/ bloodless ~** dinc/qansız inqilab; **to stir up ~** inqilab qaldırmaq; **2.** çevriliş; **palace ~** saray çevrilişi; **3.** ciddi dəyişiklik; inqilab; **a ~ in modern physics** müasir fizikada inqilab; **cultural/ technological ~** mədəni/texnoloji inqilab; **4.** hərlənmə, fırlanma, dolanma; **the ~ of celestial bodies** göy cisimlərinin fırlanması; **the ~ of the earth on its axis round the sun** yerin öz oxu ətrafında günəşin ətrafına fırlanması

**revolutionary**[1] [ˌrevəˈlu:ʃnərɪ] *n* inqilabçı; **a regime overthrown by revolutionaries** inqilabçılar tərəfindən devrilmiş rejim

**revolutionary**[2] [ˌrevəˈlu:ʃnərɪ] *adj* inqilabçı, inqilabi; **~ movements/ideas** inqilabi hərəkatlar /ideyalar; **~ leaders/ government** inqilabçı rəhbərlər/hökumət

**revolutionize, -ise** [ˌrevəˈlu:ʃnaɪz] *v* **1.** inqilabiləşdirmək; **to ~ a country** ölkəni inqilabiləşdirmək; **2.** kökündən dəyişdirmək/dəyişmək; **to ~ modern life** müasir həyatı kökündən dəyişmək/ dəyişdirmək

**revolve** [rɪˈvɔlv] *v* **1.** fırlanmaq, hərlənmək; fırlatmaq, hərlətmək; **to ~ round the sun** günəş ətrafında fırlanmaq; **to ~ round/about its axis** öz oxu ətrafında fırlanmaq; *He revolved the pencil between his fingers O, karandaşı barmaqları arasında fırlatdı*; **2.** qayıtmaq, geri dönmək, vaxtaşırı/dövraşırı/dövri əvəzlənmək; *The seasons revolve Fəsillər dövri olaraq bir-birini əvəz edir*; **3.** fikirləşmək, düşünmək, götür-qoy etmək; **to ~ a problem** problemi götür-qoy etmək

**revolver** [rɪˈvɔlvəʳ] *n* tapança *(toplu)*

**revolving** [rɪˈvɔlvɪŋ] *adj* fırlanan; **~ door** fırlanan qapı *(mehmanxanada, ofisdə və s.)*; **~ stage** fırlanan səhnə; *This theatre has a revolving stage Bu teatrın fırlanan səhnəsi var*

**revulsion** [rɪˈvʌlʃn] *n* **1.** qəfil ciddi dəyişiklik; **a ~ of mood** əhvalın qəfil dəyişməsi; **2.** nifrət; **to meet** ***smth.*** **with ~** bir şeyi nifrətlə qarşılamaq

**reward**[1] [rɪˈwɔ:d] *n* **1.** mükafat, mükafatlandırma, mükafat vermə; **in ~ for** ***smth.*** bir şeyə görə mükafatlandırma; **a ~ of valour** cəsarətə görə mükafat; **2.** *məc.* əvəz; cəza; *Hanging was the reward for desertion Bütün fərariləri dar ağacı gözləyirdi*; **3.** pul mükafatı *(cinayətkarı tutub vermək və s. üçün)*; **a ~ for saving the child** uşağı xilas etmək üçün pul mükafatı; **4.** əvəz, kompensasiya; **to offer a ~ for a stolen object** oğurlanmış şey üçün əvəz/kompensasiya təklif etmək

**reward**[2] [rɪˈwɔ:d] *v* mükafatlandırmaq, mükafat vermək; **to ~ a service** xidməti mükafatlandırmaq; **to ~** ***smb.*** **for his valour** bir kəsi igidliyinə/qoçaqlığına/ cəsarətinə görə mükafatlandırmaq

**rewind** [ˈri:ˈwaɪnd] *v (pt, pp* **rewound** [-ˈwaund]) yenidən sarımaq

**rewrite**[1] [ˈri:ˈraɪt] *n* işlənmiş/çapa hazırlanmış mətn; **a modern ~ of an old story** qədim nağılın işlənmiş müasir mətni

**rewrite**[2] [ˈri:ˈraɪt] *v (pt* **rewrote** [-ˈrout], *pp* **rewritten** [-ˈrɪtn]) təzədən/yenidən yazmaq; üzünü köçürtmək; *This essay will have to be completely rewritten Bu oçerk tamamilə yenidən yazılmalı olacaq*

**rewritten** [ˈri:ˈrɪtn] **to rewrite** *felinin pp forması*

**rewrote** [ˈri:ˈrout] **to rewrite** *felinin pt forması*

**rhetoric** [ˈretərɪk] *n* **1.** ritorika; bəlağət elmi; **the empty ~ of politicians** siyasətçilərin boş ritorikası; **2.** natiqlik sənəti; **3.** boşboğazlıq, naqqallıq

**rhetorical** [rɪˈtɔrɪkl] *adj* **1.** ritorik, bəlağətli, natiqlik; **~ skill** natiqlik bacarığı; *The speaker showed great rhetorical skill Spiker böyük ritorik bacarıq göstərdi*; **2.** təmtəraqlı, dəbdəbəli; ibarəli; **~ prose** təmtəraqlı/dəbdəbəli/ibarəli nəsr

**rheumatic** [ruˈmætɪk] *adj* **1.** *tib.* revmatizm, yel; **~ pains** yel ağrıları; **2.** yeli/ revmatizmi olan; **~ person** revmatik *(yel xəstəliyi olan adam)*

**rheumatism** [ˈru:mətɪzm] *n tib.* revmatizm, yel xəstəliyi; **to suffer from ~** revmatizmdən/yel xəstəliyindən əziyyət çəkmək



**rhinestone** [ˈraɪnstoun] *n* **1.** dağ bülluru; **2.** süni brilyant

**rhinoceros** [raɪˈnɔsərəs] *n zool.* kərgədan

**rhodium** [ˈroudjəm] *n kim.* rodium

**rhomb** [rɔmb] *n* romb

**rhombic** [ˈrɔmbɪk] *adj* romb; rombşəkilli, rombvarı, rombabənzər, rombaoxşar

**rhyme**[1] [raɪm] *n* qafiyə; **perfect/rich ~** kamil/tam qafiyə; **single/double ~** birhecalı/ikihecalı qafiyə

**rhyme**[2] [raɪm] *v* **1.** qafiyələmək, qafiyəyə salmaq; qafiyə tapmaq, şer yazmaq; **2.** qafiyələnmək; *These words do not rhyme Bu sözlər qafiyələnmir*

**rhymed** [ˈraɪmd] *adj* qafiyəli; **~ verse** qafiyəli şer

**rhythm** [ˈrɪðəm] *n* **1.** ritm, vəzn, ahəng; **~ of speech** nitqin ritmi/ahəngi; **~ of an engine** mühərrikin ritmi/ahəngi; **~ of the heart** ürəyin ritmi; **2.** ölçü *(şerdə)*

**rhythmic** [ˈrɪðmɪk] *n* ritmika **(1)** *vəzn;* **2)** *vəzn nəzəriyyəsi)*

**rhythmical** [ˈrɪðmɪkəl] *adj* ritmik, ritmli, ahəngli; **~ movement** ritmik/ritmli hərəkət; **~ prose** ritmli nəsr

**rib**[1] [rɪb] *n anat.* qabırğa; **broken ~s** sınmış qabırğalar

**rib**[2] [rɪb] *v* **(-bb-)** zarafat etmək, cırnatmaq, ələ salmaq

**ribald**[1] [ˈrɪbld, ˈraɪbɔ:ld] *n* kobud, ədəbsiz *(adam)*; hərzə danışan, ağzıyava, həyasız, söyüşcül

**ribald**[2] [ˈrɪbld, ˈraɪbɔ:ld] *adj* qaba, kobud, ədəbsiz; yaramaz, nalayiq, həyasız

**ribaldry** [ˈrɪbldrɪ] *n* qabalıq, kobudluq, sərtlik; ədəbsizlik, həyasızlıq

**ribbon**[1] [ˈrɪbən] *n* **1.** lent; bafta; **typewriter ~** yazı makinası üçün lent; **2.** nazik zolaq; **~ of road** yolun zolağı; **3.** *pl d.d.* cilov; **to take/to handle the ~s** atın cilovunu ələ almaq, atı idarə etmək; **4.** *pl* qırıq, parça, tikə; **to cut/to tear** ***smth.*** **to ~s** bir şeyi parça-parça/tikə-tikə etmək; **5.** orden lenti

**ribbon**[2] [ˈrɪbən] *v* **1.** lentlə bəzəmək; tesmadan haşiyə vermək, tesma ilə haşiyələmək; **2.** nazik zolaqlara bölmək, tikə-tikə/parça-parça etmək; *The gale ribboned the canvas Şiddətli külək yelkəni parça-parça etdi*; **3.** şaxələnmək *(yol haq.)*

**ribcage** [ˈrɪbkeɪdʒ] *n* döş qəfəsi

**rice**[1] [raɪs] *n bot.* düyü; **brown ~** çəltik *(qabığı alınmamış düyü)*; **polished ~** qabıqdan çıxarılmış düyü

**rice**[2] [raɪs] *adj* düyü; **~ field** düyü zəmisi

**rice-flour** [ˈraɪsˌflauəʳ] *n* düyü unu

**rice-paper** [ˈraɪsˌpeɪpəʳ] *n* düyü kağızı

**rich** [rɪtʃ] *adj* **(-er, -est) 1.** dövlətli; **a ~ person** dövlətli adam/şəxs; **the ~ countries of the world** dünyanın dövlətli ölkələri; **to grow/to become/to get ~** dövlətlənmək; **2.** baha, qiymətli, zəngin; **~ gifts** qiymətli hədiyyələr/bəxşişlər; **~ dresses** baha/qiymətli/zəngin paltarlar; **~ language** zəngin dil; **~ stones** qiymətli daşlar; *Oranges are rich in vitamin Portağal vitaminlərlə zəngindir*; **3.** münbit; **~ soil** münbit torpaq; **4. (in, with)** bol, zəngin; **~ in minerals/in woods** minerallarla/meşələrlə bol/zəngin; **5.** qidalı; yağlı; **~ dish** qidalı xörək; **~ milk** yağlı süd; **6.** çox yaxşı/gözəl; **~ landscape** çox gözəl mənzərə; **7.** parlaq, tünd *(rəng haq.)*; **~ red** tünd qırmızı; **8.** döşdən gələn güclü *(səs haq.)*; **~ voice** döşdən/sinədən gələn güclü səs; **9.** əyləncəli, qəribə, gülməli; **~ incident** qəribə hadisə; **~ joke** gülməli zarafat; **10. the ~** *top.i* dövlətlilər; *The rich were my enemies Dövlətlilər mənim düşmənim idilər*

**richly** [ˈrɪtʃlɪ] *adv* **1.** zəngin, dəbdəbəli; qəşəng; **~ furnished room** zəngin/dəbdəbəli/qəşəng mebel düzülmüş otaq; **2.** tamamilə, tam; *He richly deserves punishment O tamamilə cəzaya layiqdir*

**richness** [ˈrɪtʃnɪs] *n* **1.** var, dövlət, sərvət, zənginlik; **the natural ~ of the soil** torpağın təbii zənginliyi; **2.** dəyər, qiymət; **3.** bolluq, çoxluq; **4.** qidalılıq; yağlılıq; şirəlilik; **5.** parlaqlıq *(rəng haq.)*; **6.** gözəllik, calal, təmtəraq, əzəmət

**rick**[1] [rɪk] *n* I *k.t.* taya

**rick** [rɪk] *n* II burxulma

**rick**[2] [rɪk] *v* I *k.t.* taya qoymaq/vurmaq

**rick** [rɪk] *v* II burxutmaq; **to ~** ***one's*** **ankle** topuğunu burxutmaq

**rickets** [ˈrɪkɪts] *n tib.* raxit

**rickety** [ˈrɪkɪtɪ] *adj* **1.** *tib.* raxit, raxitli; **a ~ child** raxit/raxitli uşaq; **2.** laxlayan, tərpənən; **a ~ table /bridge/gate** laxlayan stol/körpü/darvaza

**rickshaw** [ˈrɪkʃɔ:] *n* rikşa *(Yaponiyada və Uzaq Şərqin bəzi ölkələrində ikitəkərli arabaya qoşulub sərnişin daşıyan adam)*

**ricochet**[1] [ˈrɪkəʃet] *n* rikoşet *(güllənin və s. dəyib yana sıçraması/sapması)*, səkdirmə; **by ~** rikoşetlə

**ricochet**[2] [ˈrɪkəʃet] *v* sapmaq, səkdirmək, dəyib geri qayıtmaq/yana sıçramaq *(uçan cisimlər haq.)*

**rid** [rɪd] *v* **(-dd-**; *pt, pp* **rid)** qurtarmaq; xilas etmək/olmaq; **to get ~ of** ***smb./smth.*** bir kəsdən /şeydən yaxa qurtarmaq; **to get ~ of fascism** faşizmdən xilas olmaq/ etmək; **to get ~ of** ***smb. /smth.*** bir kəsdən/şeydən xilas olmaq; **to ~ oneself of debt** borcdan qurtarmaq/xilas olmaq

**riddance** [ˈrɪdns] *n* **1.** qurtuluş, xilas, xilas olma, qurtulma; xilas/azad etmə; **2.** təmizləmə; qaydaya salma/salınma, yığışdırma *(otağı)*

**riddle**[1] [ˈrɪdl] *n* I **1.** tapmaca; **to solve a ~** tapmacanı tapmaq; **2.** müəmma, eyham; **to talk in ~s** eyhamla danışmaq; **3.** sirr; **~s of the universe** kainatın sirləri

**riddle** [ˈrɪdl] *n* II xəlbir, şadara

**riddle**[2] [ˈrɪdl] *v* I **1.** eyhamla danışmaq; **2.** tapmaca tapmaq

**riddle** [ˈrɪdl] *v* II **1.** xəlbirləmək, şadaralamaq,

xəlbirdən/şadaradan keçirmək; **to ~ soil/coal /wheat** torpağı/ kömürü/buğdanı xəlbirləmək; 2. deşmək, deşik-deşik etmək; **to ~ a wall/a person with shots** divarı/adamı güllə ilə deşik-deşik etmək; 3. kəskin surətdə tənqid etmək, daşını daş üstündə qoymamaq; darmadağın etmək; **to ~ *smb.'s* argument** bir kəsin dəlillərini darmadağın etmək

**ride¹** [raɪd] *n* 1. gəzinti *(atla, velosipedlə, maşınla və s.)*; **a ~ in a bus** avtobusda gəzinti; **to have/to take a ~** gəzintiyə çıxmaq; **to go for a ~** gəzintiyə getmək *(atla, maşınla və s.)*; **two hours ~** ikisaatlıq gəzinti; 2. atlılar qrupu; 3. minik atı

**ride²** [raɪd] *v (pt* **rode** [roud]; *pp* **ridden** ['rɪdn]) 1. getmək, gəlmək, gəzmək *(miniklə)*, at minmək; çapmaq; **to ~ a good seat** yaxşı at minmək/sürmək, yəhərdə möhkəm oturmaq; *He can't ride O, at minə bilmir*; 2. cıdırda/at yarışında iştirak etmək; **to ~ a race** cıdırda iştirak etmək; **to ~ in a bus** avtobusla getmək; 3. idarə etmək, sürmək; **to ~ a bycycle** velosiped sürmək; 4. **(at)** istiqamətləndirmək, yönəltmək; **to ~ *one's* horse at a fence** atı hasara yönəltmək; 5. qovmaq, çaparaq sürmək *(atı)*; **to ~ a horse to death** atı ölənə qədər qovmaq/sürmək; 6. getmək, hərəkət etmək; *The car rides smoothly/ easily Maşın rahat/yüngül gedir*; 7. üzmək; *The moon is riding in the clouds Ay buludlarda üzür*; 8. fırlanmaq; *The wheel rides on the axle Təkər oxda fırlanır*; **to ~ down** vurub salmaq/yıxmaq *(yəhərdən)*; **to ~ down the enemy** düşməni vurub yəhərdən salmaq; **to ~ out** gəzintini qurtarmaq *(atla, miniklə)*; **to ~ over** rədd etmək; **to ~ over all protests** bütün protestləri/etirazları rədd etmək;

◊ **to ~ the line** müəyyən edilmiş istiqamətdə getmək; **to ~ to hounds** at üstündə itlə ov etmək

**rider** ['raɪdəʳ] *n* 1. atlı, at sürən; **a poor/an experienced/a talented ~** pis/təcrübəli/ istedadlı at sürən; *Three riders were approaching Üç atlı yaxınlaşırdı*; 2. süvari, minik; 3. əlavə, düzəliş; 4. nəticə, xülasə

**ridge¹** [rɪdʒ] *n* 1. dağ silsiləsi, sıra dağlar; 2. suayrıcı; 3. haşiyə, kənar *(parçada)*

**ridge²** [rɪdʒ] *v* 1. qırışdırmaq, büzüşdürmək, qırış-qırış etmək, qırış əmələ gətirmək; 2. *k.t.* şırım açmaq *(torpaqda)*

**ridicule¹** ['rɪdɪkju:l] *n* 1. gülmə, ələ salma, lağa qoyma, rişxənd etmə; istehza, rişxənd; **to hold *smb.* up to ~** bir kəsə gülmək, bir kəsə rişxənd/istehza etmək; 2. gülünclük; **the ~ of such a supposition** belə bir təklifin gülüncluyü

**ridicule²** ['rɪdɪkju:l] *v* gülmək, ələ salmaq, lağa qoymaq, istehza/rişxənd etmək

**ridiculous** [rɪ'dɪkjuləs] *adj* 1. gülməli, gülünc, məzəli; mənasız, cəfəng; *She looks ridiculous in those tight trousers Bu dar şalvarda o, gülməli görünür*; 2. biabırçı, çox pis, yaramaz, iyrənc

**ridiculously** [rɪ'dɪkjuləslɪ] *adv* 1. gülməli, məzəli, gülünc; **to speak ~** gülməli/ məzəli danışmaq; 2. çox pis, biabırçı, yaramaz

**ridiculousness** [rɪ'dɪkjuləsnɪs] *n* 1. gülüncluk, mənasızlıq, cəfənglik; 2. biabırçılıq, yaramazlıq

**riding** ['raɪdɪŋ] *n* 1. at sürmə/minmə; 2. at sürmək üçün yol

**riff-raff** ['rɪfræf] *n* cəmiyyətin tör-töküntüləri/pozğun ünsürləri

**rifle¹** ['raɪfl] *n* tüfəng; **full-bore ~** irikalibrli/iriçaplı tüfəng; **small-bore ~** kiçikkalibrli/kiçikçaplı tüfəng

**rifle¹** ['raɪfl] *v* I tüfəng atmaq; tüfəngdən atəş açmaq

**rifle** ['raɪfl] *v* II 1. axtarmaq *(oğurlamaq məqsədilə)*; 2. soymaq, qopartmaq, didmək *(qabığı və s.)*

**rifled** ['raɪfld] *adj* yivli; **~ weapon** yivli silah

**rifleman** ['raɪflmən] *n (pl* **-men** [-mən]) *hərb.* atıcı, tüfənglə silahlanmış əsgər

**rift¹** [rɪft] *n* 1. çat, çatlaq, yarıq, çatlamış yer; yarğan; dərə; **a ~ in the clouds** buludlarda yarıq; 2. ciddi narazılıq *(qrupun üzvləri, dostlar və s. arasında)*; **a growing ~ between the two fractions/ friends** iki fraksiya/iki dost arasında artan ciddi narazılıq

**rift²** [rɪft] *v* yarmaq, sındırmaq; yarılmaq, sınmaq

**rig¹** [rɪg] *n* I 1. *tex.* uyğunlaşdırma, düzəltmə, qayırma; uyğunlaşdırılma, qaydaya salma/salınma; 2. qazma dəzgahı/buruğu/vışkası; 3. *k.t.* bazı *(iki şırım arasında)*

**rig** [rɪg] *n* II 1. *d.d.* fırıldaq, hiylə, kələk, hoqqa, yaramazlıq; dəcəllik, nadinclik; **to run a/the ~** dəcəllik/nadinclik etmək, gülüb-oynamaq; coşmaq, özündən çıxmaq; **to run ~s upon *smb.*** bir kəslə zarafat etmək, bir kəsi ələ salmaq/lağa qoymaq; 2. ehtikar alverçilər qrupu/dəstəsi

**rig²** [rɪg] *v* (-gg-) I 1. təchiz etmək *(gəmini)*; təchiz olunmaq *(gəmi haq.)*; 2. paraşütü yığmaq /qatlamaq

**rig** [rɪg] *v* II *d.d.* xəlvəti/əl altından iş görmək, əyri yolla əldə etmək; **to ~ an election** seçkinin nəticələrini saxtalaşdırmaq; **to ~ the market** bazar qiymətini süni yolla qaldırmaq/azaltmaq

**right¹** [raɪt] *n* I 1. düzlük, düzgünlük, doğruluq; haqq, ədalət, ədalətlilik; **to be in the ~** haqlı olmaq; **to defend the ~** haqq işini/ədaləti müdafiə etmək; 2. hüquq; **civil ~s** mülki hüquqlar; **human ~s** insan hüquqları; **natural ~s of man** insanın təbii hüquqları; **treaty ~s** razılaşdırılmış hüquqlar; **~ of nations to self-determination** xalqların öz müqəddəratını təyin etmə hüququ; **~ to work/to rest** işləmək/istirahət etmək hüququ; **~s and duties** hüquqlar və vəzifələr; **~ of search** axtarış hüququ; **~ of veto** veto (qoyma) hüququ; **to assert/to stand upon *one's* ~s** hüquqlarını qorumaq/müdafiə etmək; **to exercise *one's* ~s** hüquqlarını həyata keçirmək; **to reserve the ~** hüququnu özündə saxlamaq; 3. *pl* qayda, qayda-qanun; **to bring/to set/to put to ~s** qaydaya salmaq, qayda-qanun yaratmaq;

◊ **by ~ or wrong** ≅ mümkün olan hər vasitə ilə

**right** [raɪt] *n* II 1. sağ, sağ tərəf; **to turn/to look to the ~** sağa/sağ tərəfə dönmək/baxmaq; **to keep to the ~** sağ tərəflə getmək; 2. *hərb.* sağ cinah; *Our troops attacked the enemy's right Bizim qoşunlar düşmənin sağ cinahından hücum etdi*; 3. sağ əllə zərbə *(boksda)*; 4. sağ əlcək/ayaqqabı və s.

**right²** [raɪt] *adj* I 1. haqlı, ədalətli; günahsız, suçsuz, təqsirsiz; **to be ~** haqlı/günahsız/suçsuz olmaq; *He was quite right to refuse/in refusing my offer Mənim təklifimdən imtina etməkdə o tamamilə haqlı idi*; 2. düz, düzgün, doğru; **the ~ use of words** sözlərin düz/ düzgün işlədilməsi; **the ~ answer** doğru/ düzgün cavab; *Is that the right address? Bu, düzgün ünvandırmı? Can you tell me the right time? Sən/Siz düzgün vaxtı mənə deyə bilərsənmi?/bilərsinizmi?*; 3. sağlam, yaxşı vəziyyət; **to feel all ~** özünü yaxşı hiss etmək; **not ~ in the head** başdan xarab, anormal, gic, ağılsız; **to put/to set *smth.* ~** bir şeyi qaydaya salmaq/düzəltmək; *This medicine will soon put him right Bu dərman tezliklə onu sağaldacaq*; 4. düz *(xətt, bucaq haq.)*; 5. üz *(parça haq.)*; **to iron the ~ side** üzdən ütüləmək *(paltarı və s.)*;

◊ **to get *smth.* ~** bir şeyi tam başa düşmək/anlamaq; *That's right! Doğrudur! Düzdür!*

**right** [raɪt] *adj* II sağ; **~ hand/foot/side** sağ əl /ayaq/tərəf; **on the ~ hand** sağdan, sağ tərəfdən/yandan; sağda, sağ tərəfdə/ yanda; **~ back** sağ müdafiəçi *(futbol oyununda)*; **~ forward** sağ hücumçu *(futbol oyununda)*; **the ~ wing of a party** partiyanın sağ qanadı

**right³** [raɪt] *v* 1. həqiqəti/ədaləti bərpa etmək; 2. hüququ müdafiə etmək; **to ~ the oppressed** məzlumların hüququnu müdafiə etmək; 3. düzəltmək *(səhvi və s.)*; 4. qaydaya salmaq; **to ~ a room** otağı qaydaya salmaq; 5. əvəzini vermək *(ziyanın, itkinin)*

**right⁴** [raɪt] *adv* 1. ədalətlə, insafla; **to act ~** ədalətlə/insafla hərəkət etmək; *It serves him right Ona haqq olur*; 2. doğru, düzgün, qanunauyğun olaraq; **to get/to do a sum ~** misalı doğru/düzgün həll etmək; *Do it right or not at all Bunu ya düz et/edin, yaxud əsla etmə/etməyin*; 3. dürüst, düz, tam, tamamilə; **~ in the middle of the room** düz otağın ortasında; **~ at the time** düz/tam vaxtında; **to go ~ ahead** düz qabağa getmək; *The wind was right behind us Külək düz bizim arxamızdan əsirdi*; 4. olduqca, çox; **to know ~ well** olduqca/çox yaxşı bilmək;

◊ **~ away**, *amer.* **~ off** dərhal, gecikmədən, tez, təxirsiz; *Let's go right away/right off or we'll be late Gəl/Gəlin tez gedək, yoxsa gecikəcəyik*

**rightful** ['raɪtfl] *adj* 1. qanuni, qanunauyğun; **~ heir** qanuni vəliəhd/ varis/vərəsə; 2. ədalətli; **~ act** ədalətli hərəkət; **~ cause** ədalətli iş

**rightfully** ['raɪtfəlɪ] *adv* 1. qanunla, qanuna uyğun olaraq; 2. insafla, ədalətlə

**rightfulness** ['raɪtflnɪs] *n* 1. qanunilik, qanunauyğunluq; 2. insaf, ədalət, haqq

**right-hand** ['raɪthænd] *adj* sağ, sağ tərəfdə olan; **~ side** sağ tərəf; **~ man** "sağ əl, sadiq köməkçi/adam

**right-handed** ['raɪthændɪd] *adj* sağ əllə edilən; **~ blow** sağ əllə vurulan zərbə, sağ əl zərbəsi

**rightless** ['raɪtlɪs] *adj* hüquqsuz, hüququ olmayan, hüquqdan məhrum

**rightly** ['raɪtlɪ] *adv* 1. düz, doğru; **to be ~ informed** düz/doğru məlumat almaq; 2. ədalətlə; **to act ~** ədalətlə hərəkət etmək

**rigid** ['rɪdʒɪd] *adj* 1. bərk, əyilməyən; **~ rod** bərk mil; 2. möhkəm, ciddi, tərpənməz; sərt; **~ discipline** ciddi/möhkəm nizam-intizam; **~ rule** ciddi/möhkəm şərt/qayda; **~ axle** tərpənməz ox

**rigidity** [rɪ'dʒɪdɪtɪ] *n* 1. bərklik, sərtlik; **the ~ of the metal** metalın bərkliyi; 2. ciddilik, ciddiyyət, möhkəmlik, kəskinlik; **the ~ of the rules** qaydaların ciddiliyi/ kəskinliyi

**rigidly** [rɪ'dʒɪdlɪ] *adv* 1. amansızcasına, insafsızcasına; bərk; 2. ciddi, ciddiyyətlə, kəskin bir tərzdə

**rigmarole** ['rɪgməroul] *n* boş danışıq, cəfəngiyat, uydurma, yalan; *I've never heard such a rigmarole Mən heç vaxt belə cəfəngiyat eşitməmişəm*

**rigorous** ['rɪgərəs] *adj* 1. ciddi, bərk; **~ discipline** ciddi nizam-intizam; **~ measures** ciddi tədbirlər; 2. düz, dəqiq; **~ scientific method** dəqiq elmi metod; 3. sərt; **~ climate** sərt iqlim/ab-hava

**rigorously** ['rɪgərəslɪ] *adv* 1. ciddi, qəti, ciddi/qəti surətdə; 2. dürüst, düz, tam, tamamilə; 3. çox sərt, şiddətli, bərk

**rigor** ['rɪgəʳ] *n amer.* = **rigour**

**rigour** ['rɪgəʳ] *n* 1. ciddilik, ciddiyyət, qətilik; **with the utmost ~ of the law** qanunun bütün ciddiliyi ilə; 2. dəqiqlik, dürüstlük, doğruluq; 3. sərtlik *(iqlim haq.)*; 4. *(adət. pl)* bədbəxtlik, fəlakət, müsibət; **~s of life** həyatın müsibətləri

**rile** [raɪl] *v d.d.* 1. acıqlandırmaq, hirsləndirmək, qəzəbləndirmək; əsəbiləşdirmək; 2. bulandırmaq *(suyu)*

**rim¹** [rɪm] *n* 1. çənbər, sağanaq; **the ~ of an eyeglass** eynəyin sağanağı; **a pair of glasses with gold ~s** qızıl sağanaqlı eynək/çeşmək; 2. qıraq, kənar; **the ~ of a cup/a glass** fincanın/stəkanın kənarı; **the ~ of volcano** vulkanın kənarı/qırağı

**rim²** [rɪm] *v* (-mm-) 1. sağanaq salmaq; 2. çərçivəyə salmaq, çərçivələmək

**rime** [raɪm] *n* qırov

**rimless** [ˈrɪmlɪs] *adj* sağanaqsız; ~ **eye-glasses** pensne *(gözlük)*; sağanaqsız eynək

**rind**[1] [raɪnd] *n* qabıq *(ağacda, meyvədə, pendirdə)*; **lemon/orange/cheese** ~ limon / portağal / pendir qabığı; *Cut off the cheese rind Pendirin qabığını kəs/kəsin*

**rind**[2] [raɪnd] *v* qabığını soymaq/almaq *(ağacın, portağalın və s.)*

**rindless** [ˈraɪndlɪs] *adj* qabıqsız, qabığı soyulmuş/alınmış

**rindy** [ˈraɪndɪ] *adj* qabıqlı

**ring**[1] [rɪŋ] *n* I **1**. üzük; **a wedding** ~ nişan üzüyü; **a gold** ~ qızıl üzük; **a diamond** ~ brilyant üzük; **2**. halqa *(açar üçün)*; **3**. dairə; **children standing in a** ~ dairə vurub dayanmış uşaqlar; *There were dark rings round her eyes from lack of sleep Az yatmaqdan onun gözlərinin ətrafında qara dairə vardı*; **4**. səhnə, meydan, sirk meydanı/səhnəsi; **5**. dəstə, güruh, oğru/quldur dəstəsi; **a** ~ **of dealers** işbazların dəstəsi; **political** ~ siyasi güruh;

◊ **to hold/to keep the** ~ bitərəfliyə əməl etmək

**ring** [rɪŋ] *n* II **1**. cingilti, zınqıltı; zəng səsi; **the** ~ **of a bell** zəng zınqıltısı; **to give a** ~ cingildəmək, zınqıldamaq; **2**. zəng *(telefon və s. səsi)*; *There was a ring at the door Qapının zəngi çalındı*; **to answer a** ~ **1)** qapını açmaq; **2)** telefona cavab vermək; **to give a** ~ zəng etmək; *I'll give you a ring tomorrow Mən sabah sənə/sizə zəng edəcəm*

**ring**[2] [rɪŋ] *v* I *(pt* **rang** [ræŋ]; *pp* **rung** [rʌŋ]) **1**. zəng etmək; *I'll ring you tonight Mən bu axşam sənə/sizə zəng edəcəm; David rang when you were out Sən/Siz evdə olmayanda David zəng çaldı/vurdu*; **2**. çalınmaq *(zəng)*; *Begin to work when the bell rings Zəng çalınanda işə başla/başlayın*; **to** ~ **at the door** qapının zəngini çalmaq; **to** ~ **for tea/for dinner** çay/nahar üçün zəng çalmaq; **3**. **(out)** eşidilmək; *A shot/A command rang out Atəş/Komanda səsi eşidildi*; **4**. titrəmək; *The hall rang with applause Zal alqış səslərindən titrədi*; **5**. yayılmaq; *His deeds rang through the country Onun işi haqqında xəbər bütün ölkəyə yayıldı*; **6**. qulağında cingildəmək; *Her words ring in my ears Onun sözləri mənim qulağımda cingildəyir*; **to** ~ **off** otboy vermək *(telefon)*, dəstəyi yerinə qoymaq; **to** ~ **up** zəng /telefon etmək, telefon vasitəsilə çağırmaq; *I'll ring you up Mən sənə/sizə zəng edəcəm*

**ring** [rɪŋ] *v* II *(pt* **rang** [ræŋ]; *pp* **rung** [rʌŋ]) **1**. dövrələmək, əhatə etmək, mühasirəyə/araya almaq; *Ring the spelling mistakes with red ink Orfoqrafik səhvləri qırmızı mürəkkəblə dövrələ/ dövrələyin; The police ringed the building Polis binanı mühasirəyə aldı*; **2**. halqalamaq, halqa taxmaq/vurmaq; **to** ~ **a bird/a pig** quşu /donuzu halqalamaq, quşa/donuza halqa vurmaq; **3**. halqa-halqa kəsmək; **to** ~ **onions /orange/lemon** soğanı/portağalı/limonu halqa-halqa kəsmək

**ringer** [ˈrɪŋəʳ] *n* **1**. *(həm də* **bell-ringer)** zəng vuran *(kilsədə)*; **2**. başqa ad altında gizli olaraq yarışa qatılan atlet və ya at

**ring-finger** [ˈrɪŋˈfɪŋgəʳ] *n* adsız barmaq *(xüs. sol əldə)*

**ringleader** [ˈrɪŋ.li:dəʳ] *n* başçı, dəstəbaşı

**ringlet** [ˈrɪŋlɪt] *n* zülf, tel, burum *(saçda)*

**ringmaster** [ˈrɪŋma:stəʳ] *n* manej inspektoru *(sirkdə)*

**ring-road** [ˈrɪŋroud] *n* dairəvi yol

**rink** [rɪŋk] *n* katok *(konkida sürüşmək üçün buz meydançası)*

**rinse**[1] [rɪns] *n* **1**. yaxalama, yaxalanma, suya çəkmə/çəkilmə; **to give a** ~ yaxalamaq, suya çəkmək; **2**. yuyunma; **3**. saç üçün rəng/boya

**rinse**[2] [rɪns] *v* **1**. yaxalamaq, suya çəkmək; **to** ~ ***one's*** **hands before eating** yeməkdən qabaq əllərini yaxalamaq/yumaq; **to** ~ **(out)** ***one's*** **mouth** ağzını yaxalamaq; **to** ~ **linen** dəyşəyi /alt paltarını suya çəkmək; **2**. *d.d.* içmək *(yeməyin üstündən)*; *Rinse down with a glass of beer Yeməyin üstündən bir stəkan pivə iç/için*

**riot**[1] [ˈraɪət] *n* **1**. qiyam, üsyan, iğtişaş; **2**. ictimai asayişi pozma; şuluqluq; **3**. azğınlıq, özbaşınalıq; **4**. başlıbaşınalıq;

◊ **to run** ~ **1)** qudurğanlıq/azğınlıq etmək, özündən çıxmaq; **2)** şiddətlə/ coşğunluqla inkişaf etmək *(ot, alaq və s. haq.)*; **3)** coşmaq, şiddət etmək *(xəstəlik haq.)*; **in full** ~ qızğın çağda/vaxtda

**riot**[2] [ˈraɪət] *v* **1**. qiyamda/iğtişaşda iştirak etmək; **2**. şuluqluq/qalmaqal salmaq, azğınlıq etmək, ictimai asayişi pozmaq; *After the match the fans rioted Oyundan sonra tərəfdarlar şuluqluq saldılar*; **3**. boş-boşuna itirmək/sərf etmək *(vaxtı, pulu)*

**rioter** [ˈraɪətəʳ] *n* **1**. qiyamçı, buntçu, iğtişaşçı, qiyam/bunt/iğtişaş salan; **2**. ictimai asayişi pozan adam

**riotous** [ˈraɪətəs] *adj* **1**. qiyamçı, qiyam etmiş; **2**. qudurğan, azğın, qızğın; səs-küylü; **3**. pozğun, əxlaqsız; **to lead a** ~ **life** pozğun/əxlaqsız həyat sürmək; **4**. son dərəcə güclü, şiddətli, coşğun; ~ **fancy** coşğun/son dərəcə güclü fantaziya/ xülya/xəyal; **5**. sıx, qalın *(bitki haq.)*

**rip**[1] [rɪp] *n* I **1**. yabı; **2**. əxlaqsız, pozğun *(adam)*; **3**. heç bir dəyəri/rolu olmayan adam

**rip** [rɪp] *n* II yarıq, ara, oyma; kəsilmiş yer

**rip**[2] [rɪp] *v* **1**. cırmaq; açmaq; qopartmaq; **to** ~ **open a letter** məktubu açmaq; **to** ~ **trimming off a garment** donun haşiyəsini cırmaq; **to** ~ **the cover off** ***smth.*** bir şeyin örtüyünü qopartmaq; **2**. cırılmaq; **the sort of cloth that** ~**s at once** asanlıqla cırılan parça; **3**. yarmaq, yarılmaq *(odun haq.)*; **to** ~ **into** *d.d.* hücum etmək, üstünə atılmaq/tullanmaq; **to** ~ **off** qopartmaq, soymaq, sıyırmaq;

◊ **to** ~ **and tear** qəzəblənmək, özündən çıxmaq; **to let things** ~ səhlənkar /qayğısız olmaq, heç nəyi vecinə almamaq



**ripe** [raɪp] *adj* **1**. dəymiş, yetişmiş; ~ **apple /pear/apricot, *etc.*** dəymiş alma/armud/ ərik *və s.*; ~ **corn** yetişmiş taxıl/dən; **2**. köhnə; ~ **cheese** köhnə/dəymiş pendir; ~ **wine** köhnə/yetişmiş şərab; **3**. yetkin; püxtələşmiş; ~ **scholar** yetkin/ püxtələşmiş alim; **of** ~ **age** yetkinlik yaşı; **4**. hazır; **schemes** ~ **for execution** həyata keçirilməyə hazır planlar;

◊ **soon** ~, **soon rotten** *at. söz. Tez dəyən tez xarab olar;* ≅ *Tez alışan tez sönər*

**ripen** [ˈraɪpən] *v* dəymək, yetişmək; yetişdirmək; *The corn ripens in the sun Taxıl günəşdə yetişir; The sun ripens the corn Günəş taxılı yetişdirir*

**ripeness** [ˈraɪpnɪs] *n* **1**. dəymə, yetişmə; **2**. yetişkənlik, bitkinlik; kamillik

**ripple**[1] [ˈrɪpl] *n* I **1**. zərif dalğa, xırda/xəfif ləpə, qırış *(suyun üzərində)*; *The girl threw a stone into the pond and watched the ripples spread Qız nohura bir daş atdı və zərif dalğaların yayılmasını müşahidə etdi*; **2**. dalğavarılıq, dalğaya bənzəmə/ bənzərlik/oxşama; **3**. xəfif şırıltı; *I heard the ripple of the stream Mən axının xəfif şırıltısını eşitdim*

**ripple** [ˈrɪpl] *n* II daraq *(kətan daramaq üçün)*

**ripple**[2] [ˈrɪpl] *v* I **1**. zərif dalğalarla örtmək/ örtülmək; **2**. xəfif-xəfif/şırnaqla axmaq; **3**. gurlamaq *(gülüş və s. haq.)*; **4**. şırıldamaq, şırıltı ilə axmaq; **5**. dalğalanmaq, dalğalandırmaq; *The lake rippled gently Göl xəfifcə dalğalandı; The wind rippled the cornfield Külək taxıl tarlasını dalğalandırdı*

**ripple** [ˈrɪpl] *v* II daramaq *(kətanı)*

**rip-roaring** [rɪpˈrɔ:rɪŋ] *adj* **1**. *amer.* coşğun, hay-küylü, gurultulu; **a** ~ **speech** coşğun/ hay-küylü nitq; **2**. çox böyük; *The play was a rip-roaring success Pyes çox böyük müvəffəqiyyət qazandı*

**rise**[1] [raɪz] *n* **1**. təpə, yoxuş; ~ **in a road** yolda yoxuş; *The house stands on a rise Ev təpənin üstündədir*; **2**. qalxma, yüksəlmə; artma; **the** ~ **and fall of the prices/voice** qiymətlərin/səsin qalxması/ düşməsi; ~ **of temperature** temperaturun qalxması/yüksəlməsi; **to ask for a** ~ **of wages** maaşların artırılmasını xahiş etmək; **3**. qalxma, çıxma, doğma *(günəş, ay haq.)*; **4**. əmələ/meydana gəlmə, törəmə, baş vermə; başlanğıc; **at the** ~ **of industrialism** sənayeləşmənin başlanğıcında/ilk çağında; **5**. mənbə, çayın başı; **6**. dirilmə, həyata qayıtma; **7**. qabarma *(dəniz haq.)*; *The rise of the tide is 2 metre Qabarmanın hündürlüyü 2 metrdir*;

◊ **to be on the** ~ yaxşılaşmaq, düzəlmək *(iş və s.)*, yüksəlişdə olmaq; **to give** ~ **to** səbəb olmaq, yaratmaq; *His disappearance gave rise to different rumours Onun yox/qeyb olması müxtəlif şayiələrə səbəb oldu/şayiələr yaratdı*; **to get/to take a** ~ **out of** ***smb.*** bir kəsi özündən çıxartmaq, bir kəsi əsəbiləşdirmək /qəzəbləndirmək

**rise**[2] [raɪz] *v (pt* **rose** [rouz]; *pp* **risen** [ˈrɪzn]) **1**. çıxmaq, doğmaq *(günəş, ay haq.)*; *What time does the sun rise? Günəş nə vaxt çıxır/doğur?; The moon rose and everything round was seen Ay doğdu/çıxdı və ətrafdakı hər şey göründü*; **2**. qalxmaq, ayağa durmaq; **to** ~ **from the table** stoldan qalxmaq; *All rose to meet her Onu qarşılamaq üçün hamı ayağa qalxdı*; **3**. qalxmaq *(yuxudan)*; **to** ~ **early/late** tez/gec qalxmaq; **4**. dirilmək *(öldükdən sonra)*; **5**. yüksəlmək, qalxmaq; qaldırmaq; *The plane rose in the air Təyyarə havaya qalxdı; The horse rose on its hind legs At dal ayaqları üstə qalxdı*; **to** ~ ***one's*** **hand** əlini qaldırmaq; *He rose his hands in solute Salam işarəsi olaraq o, əlini qaldırdı; The mist is rising Duman qalxır; The road began rising Yol yüksəlməyə başladı*; **6**. artmaq, yüksəlmək *(qiymət, tələb haq.)*; *Prices/Demands rise Qiymətlər/Tələblər artır/yüksəlir*; **7**. güclənmək, qalxmaq; *The wind rises Külək qalxır*; **to** ~ **above** ***smth.*** bir şeydən yüksək/üstün olmaq; **8**. irəliləmək *(ictimai həyatda)*, çəki əldə etmək; **to** ~ **to greatness** böyük adam olmaq, məşhurlaşmaq; *He rose to international fame almost overnight O demək olar ki, bir gecədə dünyəvi şöhrət qazandı*; **9**. qiyam/üsyan etmək; qalxmaq, qalxışmaq; **to** ~ **in arms** əldə silah üsyan etmək/üsyana qalxışmaq; **to** ~ **against oppression** zülmə/əsarətə qarşı qiyam/ üsyan etmək/qaldırmaq; **10**. başlanğıcını götürmək, başlanmaq; *The river rises from a spring Çay başlanğıcını bulaqdan götürür; The quarrel rose from a mere trifle Mübahisə boş bir şeydən başlandı*; **11**. qurtarmaq, sona çatmaq *(iclas, qurultay, parlament sessiyası haq.)*; **12**. *d.d.* böyütmək, tərbiyə etmək;

◊ **to** ~ **to the bait/to the fly** tələyə/tora düşmək

**risen** [rɪzn] *v* **to rise** *felinin pp forması*

**riser** [ˈraɪzəʳ] *n* qalxan *(yuxudan)*; **an early** ~ yuxudan tez/erkən qalxan; **a late** ~ yuxudan gec qalxan; *He is an early riser O, yuxudan tez qalxır; They are late risers Onlar yuxudan gec qalxırlar*

**rising**[1] [ˈraɪzɪŋ] *n* 1. üsyan; **to suppress the ~** üsyanı yatırmaq; *Troops were brought in to suppress the rising Üsyanı yatırmaq üçün qoşun gətirdilər*; 2. qalxma, artma; 3. dirilmə; 4. çıxma, doğma *(günəş, ay haq.)*; **the ~ of the sun/of the moon** günəşin/ayın çıxması; 5. *tib.* şiş, sızanaq
**rising**[2] [ˈraɪzɪŋ] *adj* 1. artan; **~ excitement** artan əndişə/narahatlıq; 2. qalxan, çıxan; doğan; **the ~ moon** doğan/çıxan ay; **~ and falling tones** *fon.* qalxan və düşən tonlar;
◊ **the ~ generation** böyüməkdə olan nəsil
**risk**[1] [rɪsk] *n* risk *(təhlükə, qorxu, xətər)*; **to run a/the ~, to take ~s** risk etmək, təhlükədən qorxmayaraq hərəkət etmək, qorxulu /təhlükəli işə girişmək; *I'll take the risk Mən risk edəcəm*; **at one's own ~** məsuliyyəti/cavabdehliyi öz üzərinə götürərək iş görmə/hərəkət etmə; **to put one's life at ~** həyatını riskə qoymaq, ≅ həyatını qumara qoymaq; **at the ~ of one's life** həyatı ilə risk edərək, həyatı bahasına
**risk**[2] [rɪsk] *v* 1. risk etmək, təhlükədən qorxmayaraq hərəkət etmək/iş görmək, qorxulu işə girişmək; təhlükə altına qoymaq/salmaq; **to ~ one's life** həyatını təhlükə altına qoymaq/salmaq; *You should not risk marriage/marrying unless you are absolutely sure about it Sən/Siz tam əmin olmadan evlənməməlisən /evlənməməlisiniz*; 2. cəsarət etmək, cürətlənmək; **to ~ a battle** döyüşə cəsarət etmək
**riskful** [ˈrɪskfl] *adj* qorxulu, təhlükəli, xətərli, xatalı; **a ~ action/decision** qorxulu hərəkət/qərar
**riskiness** [ˈrɪskɪnɪs] *n* təhlükə, qorxu, xətər; qorxuluq, təhlükəlilik, xətərlilik
**risky** [ˈrɪskɪ] *adj* qorxulu, təhlükəli, xatalı; **a ~ job** təhlükəli iş
**riskily** [ˈrɪskɪlɪ] *adv* təhlükəli, qorxulu; təhlükəli/qorxulu surətdə
**rite** [raɪt] *n* adət, qayda, mərasim; **marriage /funereal ~s** evlənmə/dəfn mərasimləri
**ritual**[1] [ˈrɪtʃəl] *n* adət, mərasim; **the ~ of the Catholic Church** katolik kilsə mərasimi; **the Japanese tea ~** yapon çay mərasimi
**ritual**[2] [ˈrɪtʃəl] *adj* mərasim; dini mərasimə aid, dini mərasimlə əlaqədar olan; **a ~ dance** dini mərasimlə əlaqədar olan rəqs
**ritualize, -ise** [ˈrɪtʃuəlaɪz] *v* 1. mərasimə/adətə riayət etmək, adəti/ənənəni gözləmək; 2. adətə /ənənəyə çevirmək
**ritually** [ˈrɪtʃəlɪ] *adv* dini mərasimlə əlaqədar /bağlı olaraq
**ritualism** [ˈrɪtʃuəlɪzm] *n* mərasim, ənənə, adət
**rival**[1] [ˈraɪvəl] *n* 1. rəqib; **~s in love** məhəbbətdə /sevgidə rəqiblər; **to be jealous of one's ~** rəqibini qısqanmaq; **without a ~** 1) rəqibi olmama; 2) tayı-bərabəri olmama, taysız-bərabərsiz; 2. *hərb.* düşmən
**rival**[2] [ˈraɪvəl] *adj* rəqabət aparan; rəqib; **a ~ firm** rəqabət aparan firma; **a ~ team** rəqib komanda; *We beat the rival team for two years straight Biz artıq iki ildir ki, rəqib komandanı məğlub edirik*
**rival**[3] [ˈraɪvəl] *v* rəqabət aparmaq, rəqib olmaq; *No one can rival her when it comes to looks Gözəllikdə heç kim onunla rəqabət apara bilməz, Gözəllikdə heç kim ona tay ola bilməz; Ships can't rival aircrafts for speed Gəmilər sürətdə təyyarələrlə rəqabət apara bilməz*
**rivalry** [ˈraɪvlrɪ] *n* rəqabət; **friendly ~** dostcasına rəqabət
**rive** [raɪv] *v* (*pt* **rived** [raɪvd], *pp* **riven** [ˈrɪvən]) 1. qırmaq, parçalamaq, doğramaq; kəsmək, vurmaq; **to ~ off a branch** budağı kəsmək/vurmaq; *The union is riven with discard Ziddiyyətlər ittifaqı parçalayır*; 2. qırılmaq, parçalanmaq, doğranmaq; 3. **(off)** qopartmaq, soymaq; *The bark of the tree was riven off Ağacın qabığı soyulmuşdu*
**riven** [ˈrɪvən] **to rive** *felinin pp forması*
**river** [ˈrɪvər] *n* 1. çay *(axar)*; **the River Thames** Temza çayı; **the River Kur** Kür çayı; **the mouth of the ~** çayın ağzı *(dənizə tökülən yeri)*; **to cross the ~** çayı keçmək; 2. axın, sel; **a ~ of tears/of blood** yaş/qan seli;
◊ **to cross the ~** 1) maneəni aradan qaldırmaq; 2) ölmək
**river-bank** [ˈrɪvəbæŋk] *n* çay sahili; **to walk along the ~** çay sahili boyunca gəzmək
**river-bed** [ˈrɪvəbed] *n* çay yatağı; *It's so long since it rained that the river-bed is dry Çoxdan yağış yağmadığından çayın yatağı qurudur*
**riverless** [ˈrɪvəlɪs] *adj* çaysız, çayı olmayan
**riverside** [ˈrɪvəsaɪd] *n* çay qırağı/sahili
**river-water** [ˈrɪvə,wɔ:tər] *n* çay suyu
**rivet**[1] [ˈrɪvɪt] *n* pərçim, qadaq
**rivet**[2] [ˈrɪvɪt] *v* 1. pərçimləmək; 2. mərkəzləşdirmək, bir yerə toplamaq *(diqqəti)*, yönəltmək, çevirmək *(baxışı)*; **to ~ one's eyes on smth.** gözlərini bir şeyə dikmək/zilləmək; **to ~ one's attention on smth.** diqqətini bir şeyə cəmləşdirmək/cəmləmək
**rivulet** [ˈrɪvjələt] *n* kiçik/balaca çay
**road**[1] [roud] *n* 1. yol; **arterial ~** magistral, əsas /baş yol; **a country ~** torpaq yol, kənd yolu; **a high ~** böyük yol, şose; **mountain ~** dağ yolu; **to give smb. the ~** bir kəsə yol vermək; **to be on the ~** yolda olmaq; **the ~ to fame/to victory** şöhrətə/qələbəyə gedən yol; *Get out of my road Mənim yolumdan çəkil/çəkilin*; 2. küçə; **to cross the ~** küçəni keçmək;
◊ **to be /to get in the smb.'s ~** bir kəsin yolunda maneə olmaq, bir kəsə maneçilik törətmək



**road**[2] [roud] *adj* yol; **a ~ map** yol xəritəsi; **~ accidents** yol hadisələri; **~ signs** yol işarələri
**roadless** [ˈroudlɪs] *adj* yolsuz, yolu olmayan
**road-maker** [ˈroud,meɪkər] *n* yol çəkən, yol çəkən fəhlə
**roam** [roum] *v* səyahət etmək, gəzib dolaşmaq; veyllənmək, avara-avara gəzmək; dərbədər /sərgərdan gəzmək, sərsəri həyat sürmək; **to ~ about the forest** meşədə gəzib dolaşmaq; **to ~ the world** dünyanı gəzib dolaşmaq
**roamer** [ˈroumər] *n* səyyah; sərsəri, sərgərdan, dərbədər, avara, səfil, yurdsuz *(adam)*
**roan**[1] [roun] *n* çal at
**roan**[2] [roun] *adj* çal; **a ~ horse** çal at
**roar**[1] [rɔ:r] *n* 1. nərilti, bağırtı, gurultu; böyürtü; **the ~ of a lion** şirin nəriltisi; **the ~ of a crowd** camaatın bağırtısı; **the ~ of a sea/of the waves** dənizin/dalğaların gurultusu; **the ~ of guns** topların gurultusu; **the ~ of an angry bull** acıqlı kələnin/buğanın böyürtüsü; 2. qəhqəhə; **~s of laughter** gülüşün qəhqəhələri
**roar**[2] [rɔ:r] *v* 1. nərildəmək, bağırmaq, böyürmək; *The lion roared Şir/Aslan nərildədi; The football fans roared Futbol azarkeşləri bağırdı; The angry bull roared Acıqlı buğa/kələ böyürdü*; 2. ucadan ağlamaq, hönkürmək, hönkürərək ağlamaq, qışqırmaq; **to ~ with pain** ağrıdan hönkürmək/hönkürə-hönkürə ağlamaq/qışqırmaq; *Don't roar at me! Mənim üstümə qışqırma/qışqırmayın!*; 3. qəhqəhə çəkmək, qəhqəhə ilə gülmək; **to ~ with laughter** ucadan qəhqəhə çəkmək/gülmək
**roarer** [rɔ:rər] *n d.d.* qışqırıqçı, çığırqan; boşboğaz *(adam)*
**roaring** [ˈrɔ:rɪŋ] *adj* 1. gurultulu, səs-küylü; **~ applause** gurultulu alqış; 2. gurlayan; guruldayan; **~ thunder/guns** gurlayan/ guruldayan ildırım/toplar; 3. çiçəklənən, qızğın; **~ trade** qızğın ticarət
**roast**[1] [roust] *n* 1. qızartma, qızardılmış ət; 2. *amer.* kəskin/ciddi/amansız tənqid
**roast**[2] [roust] *adj* qızardılmış; qovrulmuş; **~ meat** rostbif *(qızardılmış mal əti)*; **~ chestnuts** qovrulmuş şabalıd
**roast**[3] [roust] *v* 1. qızartmaq, qovurmaq; **to ~ a chicken** çolpa qızartmaq; **to ~ some potatoes** bir az kartof qızartmaq; **to ~ chestnuts** şabalıd qovurmaq; 2. qızarmaq, qovrulmaq; *The meat /The chicken is roasting nicely Ət/Çolpa ələ /qəşəng qızarır; I'm roasting in this sweater Mən bu sviterin içində bişirəm;* 3. qızdırmaq, qızınmaq; **to ~ one's feet at the fire** ayaqlarını ocaqda qızdırmaq; **to ~ oneself before the fire** özünü ocağın qabağında qızındırmaq
**roaster** [ˈroustər] *n* 1. qızartmaq üçün aparat *(əti, çolpanı və s.)*; 2. manqal, kürə; 3. qaz/ördək qızartmaq üçün uzunsov qazan / qab/tava
**roasting**[1] [ˈroustɪŋ] *n* kəskin tənqid/tənbeh/ danlaq; **to give a ~** tənqid/tənbeh etmək, danlamaq; *My father gave me a real roasting for coming home late Evə gec gəldiyimə görə atam məni bərk danladı*
**roasting**[2] [ˈroustɪŋ] *adj* bişirən, qovuran, çox isti olan
**roasting-jack** [ˈroustɪŋdʒæk] *n* şiş
**rob** [rɔb] *v* (-bb-) 1. soymaq, qarət etmək, talamaq, çalıb-çapmaq; **to ~ a bank** bankı qarət etmək; **to ~ a house** ev soymaq/talamaq; **to ~ a country** ölkəni çalıb-çapmaq/qarət etmək; 2. oğurlamaq; *They robbed me of my money/of my watch Onlar mənim pulumu/saatımı oğurladılar*; 3. məhrum etmək, əlindən almaq; **to ~ smb. of his rights** bir kəsi hüquqlarından məhrum etmək, bir kəsin hüquqlarını əlindən almaq; *You have robbed me of my happiness Sən/Siz mənim xoşbəxtliyimi əlimdən almısan/ almısınız*
**robber** [ˈrɔbər] *n* soyğunçu, qarətçi, talançı, çapqınçı, quldur, yolkəsən; oğru
**robbery** [ˈrɔbərɪ] *n* soyğunçuluq, talançılıq, çapqınçılıq, quldurluq; oğurluq; **daylight ~** günün günorta çağı quldurluq/talançılıq/soyğunçuluq; *To ask such prices is sheer robbery Belə qiymət demək əslində soyğunçuluqdur*
**robe**[1] [roub] *n* 1. xalat; 2. mantiya *(plaş şəklində qolsuz, uzun üst geyimi)*; **a royal ~** kral mantiyası; **judges' ~** hakimlərin mantiyası; **an academic ~** professor mantiyası; 3. *şair.* geyim, libas;
◊ **gentlemen of the long ~** hakimlər, hüquqşünaslar
**robe**[2] [roub] *v* xalat/mantiya geymək
**robin** [ˈrɔbɪn] *n* 1. *zool.* birəbitdən quşu; 2. *zool.* qaratoyuq
**robot** [ˈroubɔt] *n* 1. robot, mexaniki adam; 2. mexaniki qurğu; 3. *av.* avtomat idarə etmə; 4. fikirləşmədən iş görən adam
**robotic** [rouˈbɔtɪk] *adj* robot, robot kimi hərəkət edən; **~ movements** robot hərəkətləri
**robotics** [rouˈbɔtɪks] *n* robot texnologiyası, robotla idarə etmə haqqında elm
**robotization** [,roubɔtɪˈzeɪʃn] *n* robotlaşdırma; avtomatlaşdırma
**robust** [rəˈbʌst] *adj* 1. sağlam, möhkəm, qüvvətli; **a ~ young fellow** sağlam/ möhkəm /qüvvətli gənc; **~ health** möhkəm sağlamlıq; 2. çətin, ağır; **~ work** çətin iş
**robustly** [rəˈbʌstlɪ] *adv* sağlam, möhkəm, bərk; güclü; **~ made furniture** möhkəm qayrılmış mebel

**robustness** [rə'bʌstnıs] *n* **1**. sağlamlıq, möhkəmlik, bərklik; **2**. çətinlik

**rock**[1] [rɔk] *n* I **1**. qaya; **as firm as a ~** qaya kimi bərk; *The boat was wrecked on a rock Qayıq qayaya dəyib dağıldı*; **2**. *amer*. daş, qənbər

**rock** [rɔk] *n* II müasir səs-küylü musiqi

**rock** [rɔk] *n* III yırğalama, yellətmə, yelləmə, yırğalanma; səndələmə

**rock**[2] [rɔk] *v* **1**. yelləmək, yırğalamaq; **to ~ a cradle** beşiyi yırğalamaq; **to ~ oneself from side to side** özünü o yan bu yana yırğalamaq/yelləmək; *The waves rocked the boat Dalğalar qayığı yırğaladı*; **2**. yellənmək, yırğalanmaq; *The trees rock in the wind Ağaclar küləkdə yırğalanır*; **3**. silkələmək, əsdirmək; əsmək, titrəmək; *The explosion made the whole house rock Partlayış bütün evi titrətdi*; **4**. laylay çalmaq, laylay çalıb yatırtmaq; tərpədib/ yırğalayıb yatırtmaq; **to ~ the baby to sleep** laylay çalıb körpəni yatırmaq; **to ~ a child in a cradle/in *one's* arms** uşağı beşikdə/qolları üstündə yırğalayıb yatırtmaq

**rock and roll** [ˌrɔkn'roul] *n* = **rock'n roll**

**rocker** ['rɔkəʳ] *n* **1**. yellənən/yırğalanan kreslo; **2**. beşik; **3**. *tex*. taraz, pərsəng

**rocket**[1] ['rɔkıt] *n* **1**. fişəng; **a distress ~** fəlakət fişəngi; **2**. raket; **an atomic ~** atom mühərrikli raket; **a ballistic/cosmic ~** ballistik/kosmik raket; **moon ~** aya uçmaq üçün raket; **3**. reaktiv mərmi

**rocket**[2] ['rɔkıt] *adj* raket; **a ~ base** raket bazası; **~ fuel** raket yanacağı; **~ warfare** raket müharibəsi; **~ weapons** raket silahları

**rocket**[3] ['rɔkıt] *v* **1**. raket buraxmaq; **2**. kəskin sürətdə irəli atılmaq *(at haq.)*

**rock'n roll** ['rɔkn'roul] *n* rok-n-rol *(rəqs növü)*

**rocky** ['rɔkı] *adj* I **(-ier, -iest) 1**. qayalı, daşlı; **~ shore** qayalı/daşlı sahil; **~ path** daşlı cığır; **2**. bərk, möhkəm, sarsılmaz

**rocky** ['rɔkı] *adj* II **(-ier, -iest)** laxlayan, tərpənən; **~ table** laxlayan/tərpənən stol; *Be careful of that chair – it is a bit rocky Bu stoldan ehtiyatlı ol/olun – o bir az laxlayır*

**rod** [rɔd] *n* **1**. çubuq; tənək; **2**. şüvül; qamçı; **3**. *məc*. cəza, çubuq cəzası, çubuqla döymə; *The rod is not allowed in this school Bu məktəbdə çubuq cəzasına icazə verilmir*; **4**. *hərb*. sünbə; **5**. tilov, qarmaq

**rode** [roud] **to ride** *felinin pt forması*

**rodent** ['roudənt] *n zool*. gəmirici

**rogue**[1] [roug] *n* **1**. fırıldaqçı, kələkbaz, hiyləgər, dələduz; yaramaz, alçaq, əclaf; **2**. nadinc, şuluqçu, dəcəl; **to play the ~** nadinclik/dəcəllik etmək

**rogue**[2] [roug] *v* kələkbazlıq/biclik/ dələduzluq etmək, aldatmaq, fırıldaq işlətmək, adam aldatmaq

**roguery** ['rougərı] *n* **1**. fırıldaq, fırıldaqçılıq, kələk, kələkbazlıq; **2**. nadinclik, dəcəllik, şuluqluq

**roguish** ['rougıʃ] *adj* **1**. kələkbaz, fırıldaqçı; **2**. nadinc, dəcəl; **a ~ child** nadinc/dəcəl uşaq

**roguishly** ['rougıʃlı] *adv* **1**. kələkbazlıqla, fırıldaqla, fırıldaqçılıqla; **2**. dəcəlcəsinə, nadinc /dəcəl bir tərzdə

**roguishness** ['rougıʃnıs] *n* **1**. kələkbazlıq, fırıldaqçılıq; **2**. nadinclik, dəcəllik

**role** [roul] *n fr*. rol; **to play the leading ~** baş/aparıcı rol oynamaq; **to play a variety of roles** müxtəlif/çeşidli rollar oynamaq; **the ~ of the teacher in the learning process** müəllimin tədrisdə/ təlimdə rolu; **to play the ~ of *smb*.** bir kəsin rolunu oynamaq; *Oliver played the role of Hamlet Oliver Hamlet rolunu oynadı*

**roll**[1] [roul] *n* **1**. rulon *(lülə şəklində bükülmüş kağız və s.)*; **a ~ of wall paper** bir rulon divar kağızı; **a ~ of carpet/cloth** bir rulon xalça/parça; *Wallpaper is sold in rolls Divar kağızı rulonla satılır*; **2**. yumru, lülə; **a ~ of soap** yumru sabun; **3**. hərlənmə, fırlanma, diyirlənmə, yumarlanma; **to have a ~ on the grass** otun üstündə yumarlanmaq; **4**. gurultu; **the ~ of thunder** ildırımın gurultusu; **5**. *id*. mayallaq, dombalaq; **back/front ~** geri/irəli mayallaq; **6**. *id*. tullama, çevirmə *(güləşdə)*; **7**. *tex*. val *(fırlanan silindr)*, vərdənə; rolik; makara

**roll**[2] [roul] *v* **1**. diyirlətmək, gillətmək, diyirlədə-diyirlədə aparmaq; **to ~ *smth*.** bir şeyi diyirlətmək; **to ~ a barrel** çəlləyi diyirlətmək; *We rolled a barrel of oil onto the ship Biz bir çəllək yağı gəmiyə diyirlətdik*; **2**. diyirlənmək, gillənmək; *The ball rolled into the hole Top çalaya diyirləndi/diyirlənib çalaya düşdü; The tears were rolling down her cheeks Yaş onun yanaqlarından aşağı diyirlənirdi; The coin rolled under the table Dəmir pul/Sikkə stolun altına diyirləndi*; **3**. bükmək *(lülə şəklində)*; **to ~ *smth*. in a piece of paper** bir şeyi bir parça kağıza bükmək; **to ~ a carpet/a cigarette/a map** xalça/papiros/xəritə bükmək; **4**. bürünmək; **to ~ oneself in a blanket** yorğana bürünmək; **5**. yırğalamaq, yellətmək, tərpətmək; *The sea slowly rolled the ship Dəniz gəmini yavaş-yavaş yırğalayırdı/tərpədirdi*; **6**. yırğalanmaq, ləpələnmək *(dəniz və s. haq.)*; **7**. sarımaq, dolamaq *(ipi, sapı və s.)*; **to ~ cotton round a reel** pambıq sapı tağalağa dolamaq/sarımaq; **8**. yumaq kimi qıvrılmaq; *The hedgehog/The cat rolled Kirpi/Pişik yumaq kimi qıvrıldı*; **9**. gurlamaq; *The thunder rolled heavily İldırım bərk gurladı*; **10**. yaymaq *(xəmiri)*; **to ~ paste** xəmir yaymaq; **to ~ along** sürətlə getmək *(miniklə); He rolled along in*



*his car O, maşınında sürətlə getdi*; **to ~ away 1**) tullamaq, atmaq *(kənara)*; **2**) diyirlənmək, yuvarlanmaq; **3**) dağılmaq, çəkilmək *(duman haq.)*; **to ~ by 1**) yanından ötüb keçmək; **2**) ötüb keçmək, ötmək *(vaxt haq.); Years rolled by uneventfully İllər elə bir ciddi hadisə olmadan ötüb keçdi*; **to ~ up** bükmək *(lülə şəklində)*; **to ~ up a picture** şəkli bükmək;

◊ **to ~ logs for *smb*.** bir kəs üçün ağır iş görmək; *Roll my log and I'll roll yours at. söz.* ≅ *Əl əli yuyar, əl də üzü*

**Roman**[1] ['roumən] *n* **1**. romalı; **2**. *d.d.* katolik *(katolik dinınə məxsus adam)*; **3**. latın dili

**Roman**[2] ['roumən] *adj* **1**. Roma; **2**. latın, rum; **the ~ alphabet** latın əlifbası; **~ numerals** rum rəqəmi

**Romance** [rou'mæns] *adj* roman; **~ languages** roman dilləri; **~ nations** roman xalqları; *Spanish and French are Romance languages İspan və fransız dilləri roman dil ailəsinə aiddir*

**romantic**[1] [rou'mæntık] *n* romantik *(xəyalpərəst)*

**romantic**[2] [rou'mæntık] *adj* romantik; xəyalpərəst; **~ youth/girl** romantik gənc/qız; **~ adventure** romantik macəra/ sərgüzəşt; **~ poetry** romantik poeziya

**romantically** [rou'mæntıklı] *adv* romantik, romantikcəsinə, xəyalpərəstcəsinə

**romanticism** [rə'mæntısızm] *n* romantizm

**romanticist** [rə'mæntısıst] *n* romantik, romantizm tərəfdarı, xəyalpərəst

**romanticize, -ise** [rə'mæntısaız] *v* romantikləşdirmək, ideallaşdırmaq

**Romany**[1] ['rɔmənı] *n* **1**. qaraçı; **2**. qaraçı dili; **the ~** *top. i* qaraçılar

**Romany**[2] ['rɔmənı] *adj* qaraçı; **the ~ language** qaraçı dili; **~ customs** qaraçı adətləri

**Romish** ['roumıʃ] *adj* katolik; **the ~ church** katolik kilsəsi

**romp**[1] [rɔmp] *n* **1**. dəcəl, nadinc, şuluqçu *(uşaq haq.)*; dəlibaş, dəlisov; **2**. səs-küylü oyun, səs-küy

**romp**[2] [rɔmp] *v* **1**. səs-küylə oynamaq *(uşaqlar haq.)*; **2**. asanlıqla ötmək/ötüb keçmək *(at haq.: yarışda)*; **to ~ home/in** asanlıqla udmaq *(at haq.)*

**roof**[1] [ru:f] *n (pl* **roofs) 1**. dam, dam örtüyü; **a leaking ~** daman/suburaxan dam örtüyü; *The roof is leaking again Dam örtüyü yenə də axıdır*; **2**. qübbə; tağtavan; **the ~ of heaven** səma, göy qübbəsi; **the ~ of the room** otağın tavanı; **the ~ of the mouth** damaq;

◊ **to rise/to hit the ~** *jarq*. **1**) səs-küy qaldırmaq; **2**) qışqırmaq, söyüşmək, uca səslə şikayətlənmək

**roof**[2] [ru:f] *v* **1**. örtmək *(həm də* **to ~ in/ over)**; *The cottage is roofed with tiles Bu kottecin damı kirəmitlə örtülüb*; **2**. qübbə əmələ gətirmək; *The branches roofed the walk Budaqlar cığırın üstündə qübbə əmələ gətirmişdi*; **3**. sığınacaq vermək

**roofing** ['ru:fıŋ] *n* dam; taxtapuş materialı; dam örtüyü üçün istifadə edilən material; **~ tiles /states** dam kirəmiti/şiferi; **a ~ felt** damı örtmək üçün keçə

**roofless** ['ru:flıs] *adj* **1**. damsız, damı örtülməmiş/ olmayan; **2**. evsiz, evsiz-eşiksiz, yurdsuz

**room**[1] [ru:m] *n* **1**. otaq; **a dining ~** yemək/nahar otağı; **a single ~** bir adamlıq otaq; **double ~** iki adamlıq otaq; **to share a ~ with *smb*.** bir kəslə bir otaqda yaşamaq; **to do *one's* ~** otağını yığışdırmaq; *She has done her room O, otağını yığışdırıb*; **teachers' ~** müəllimlər otağı; **2**. yer, məkan; **~ for to land** oturmaq üçün yer; *There is room for one more person in the car Maşında daha bir nəfərə yer var; There is no room for doubt Şübhəyə yer yoxdur*; **3**. əsas; *There is no room left for complaint Şikayətlərə heç bir əsas qalmayıb/yoxdur*;

◊ **~ and board** yataq və yemək; *What do they charge for room and board? Yatmağa və yeməyə onlar nə qədər alırlar?*; **in the ~ of *smb*., in *smb*.'s ~** bir kəsin yerinə/əvəzinə; **to prefer a man's ~ to his presence/to his company** bir kəsi görməməyi üstün tutmaq, bir kəsi görmək istəməmək

**room**[2] [ru:m] *v amer*. bir otaqda yaşamaq; *He's rooming with my friend O mənim dostumla bir otaqda yaşayır; We roomed together Biz bir otaqda yaşadıq*

**roomful** ['ru:mfl] *n (pl* **-fuls)** bir otaq, otaq dolusu; **a ~ of people** bir otaq adam

**roominess** ['ru:mınıs] *n* genişlik; genlik

**room-mate** ['ru:mmeıt] *n* otaq yoldaşı

**roomy** ['ru:mı] *adj* **(-ier, -iest)** geniş, tutumlu; **a ~ hall/car/building** geniş zal/ maşın/bina

**roost**[1] [ru:st] *n* **1**. toyuq hini/damı; tar; **to take ~** tarda oturmaq; **to go to ~** tara çıxmaq; **2**. *d.d.* yataq otağı, yatacaq; **at ~** yataqda; **to go to ~** yatmaq, yatmağa getmək

**roost**[2] [ru:st] *v* tarda oturmaq, yatmaq *(quş haq.)*

**rooster** ['ru:stəʳ] *n* **1**. xoruz; **2**. *məc*. davakar, dalaşqan

**root**[1] [ru:t] *n* **1**. kök; **edible ~** yeməli kök; **to pull a plant up by the ~s** bitkini kökündən çıxartmaq; **the ~ of a hair** tükün kökü; **the ~ of a tooth** dişin kökü; **2**. əsas; **the ~ of the matter** məsələnin əsası; **the ~ of all evil** bütün şərin/pisliyin əsası; **~s of race conflicts** irqi münaqişələrin əsası; **3**. *riyaz*. kök; **square/second ~** kvadrat kök; **4**. *qram*. kök; **the ~ of the word** sözün kökü;

◊ **~ and branch** tamamilə, köklü-dibli, yerli-

köklü, köklü-gövdəli; **to destroy an organization ~** təşkilatı tamamilə/yerli-dibli dağıtmaq

**root[2]** [ru:t] *adj* **1**. kök; **~ words** kök sözlər; **2**. əsas; **the ~ cause** əsas səbəb; **the ~ principle** əsas prinsip; **~ sign** *riyaz*. kök işarəsi

**root[3]** [ru:t] *v* **1**. kök atmaq/bağlamaq *(bitki haq.)*; **to ~ in/into the subsoil** torpağın alt qatına kök atmaq/buraxmaq; *Some plants root freely Bəzi bitkilər asanlıqla kök atır /buraxır;* **to take ~** kök atmaq/ buraxmaq; *The cuttings I took from your roses haven't taken root Sənin/Sizin güllərindən /güllərinizdən götürdüyüm çiliklər kök büraxmır*; **2**. tətbiq etmək, həyata keçirmək; **to ~ a new method of work into the production** istehsalata yeni iş metodu tətbiq etmək; **3**. mıxlanmaq; mıxlanıb qalmaq; *Fear rooted him to the ground Qorxu onu yerə mıxladı;* **4**. **(out)** uzun müddət axtardıqdan sonra tapmaq; *I've managed to root out a copy of the original document Uzun müddət axtardıqdan sonra mən sənədin bir əsl surətini tapa bildim*; **to ~ away /out/up** kökündən çıxartmaq; məhv etmək

**rooted** [ˈru:tıd] *adj* **1**. kök atmış, köklü *(bitki haq.)*; **2**. kök salmış; **deeply ~ prejudice** dərin kök salmış xurafat/mövhumat; **3**. dərin *(hiss haq.)*; **4**. xroniki, gizli *(xəstəlik haq.)*

**rootless** [ˈru:tlıs] *adj* **1**. köksüz, kökü olmayan; **2**. əsassız, əsası olmayan

**rootlessness** [ˈru:tlısnıs] *n* **1**. köksüzlük, kökü olmama; **2**. əsassızlıq, əsası olmama

**rope[1]** [roup] *n* **1**. kanat, buraz *(yoğun ip/ kəndir)*; ip, kəndir, sicim; tros; **2**. **(the ~)** kəndir *(dar ağacında)*; **3**. dar ağacından asma *(cəza)*; **4**. bağlama; **a ~ of onions** bir bağlama/asma soğan; 5. sap; **a ~ of pearls** bir sap mirvari;

◊ **to know the ~s** yaxşı bələd olmaq, cikini də, bikini də bilmək; **to put** ***smb.*** **up to the ~s, to show** ***smb.*** **the ~s** bir kəsə iş haqqında ətraflı məlumat vermək; *Give a fool rope enough, and he'll hang himself at. söz.* ≅ *Dəlinin əlinə bel ver, altından yel ver*

**rope[2]** [roup] *v* **1**. bağlamaq *(kəndirlə, burazla)*; **to ~ a box** qutunu/yeşiyi kəndirlə bağlamaq; **to ~** ***smth.*** **on to** ***smth.*** bir şeyi bir şeyə bağlamaq; **2**. *amer*. kəməndlə tutmaq; **3**. qatılaşmaq *(maye haq.)*;

◊ **to ~ in/off** kanatla/kəndirlə ayırmaq, arasını kəsmək *(torpaq sahəsini və s.); They roped off part of the street Onlar küçənin bir hissəsini kəndirlə kəsdilər*

**rope-dancer** [ˈroup.da:nsəʳ] *n* kəndirbaz

**rope-ladder** [ˈroupˈlædəʳ] *n* kəndir, nərdivan

**roper** [ˈroupəʳ] *n* **1**. qablaşdırıcı; **2**. *amer*. kovboy; **3**. provokator, fitnəçi, araqızışdıran; **4**. ştreykbrexer, satqın

**rope-walker** [ˈroup.wɔ:kəʳ] *n* = **rope-dancer**

**rose[1]** [rouz] *n bot*. **1**. qızılgül; **a red ~** qırmızı qızılgül; **a bunch of red ~s** bir dəstə qırmızı qızılgül; **2**. qızılgül kolu; *The roses in the garden have grown green Bağdakı qızılgül kolları yaşıllaşıb/ yarpaqlayıb*

**rose[2]** [rouz] **to rise** *felinin pt forması*

**rose-tree** [ˈrouztri:] *n* qızılgül kolu

**rosette** [rouˈzet] *n* **1**. mürəbbə nəlbəkisi; **2**. *tex*. divarda elektrik açarı altına vurulan lövhəcik

**rose-water** [ˈrouz.wɔ:təʳ] *n* qızılgül suyu, gülab

**rosin[1]** [ˈrɔzın] *n* kanifol *(iynəyarpaqlı ağacların şirəsindən hasil edilən bərk qatran)*

**rosin[2]** [ˈrɔzın] *v* kanifol sürtmək

**roster** [ˈroustəʳ] *n* siyahı, reyestr

**rostrum** [ˈroustrəm] *n (pl* **rostrums** *və ya* **rostra)** tribuna, xitabət kürsüsü; **to climb onto ~, to mount the ~** tribunaya/xitabət kürsüsünə qalxmaq

**rosy** [ˈrouzı] *adj* **1**. çəhrayı, qızılgül rəngli; **~ wine/sky** çəhrayı şərab/səma; **2**. al; qırmızı; **~ cheeks** al/qırmızı yanaqlar

**rot[1]** [rɔt] *n* **1**. çürümə *(həm də məc)*; **an old hollow tree full of ~** içi oyuq qoca çürük ağac; *How can we stop the rot in our society? Biz cəmiyyətimizdə çürümənin qarşısını necə ala bilərik?*; **2**. cəfəngiyyat; *Don't talk rot! Cəfəngiyyat danışma!; That's complete rot Bu tamamilə cəfəngiyyatdır*

**rot[2]** [rɔt] *v* **(-tt-) 1**. çürümək; xarab olmaq; *A fallen tree soon rots Yıxılan ağac tezliklə çürüyür*; **2**. arıqlamaq, zəifləmək, ərimək; **3**. dağılmaq *(cəmiyyət və s. haq.)*; **4**. çürütmək, xarab/məhv etmək; **to ~ the whole plan** bütün planı xarab/məhv etmək

**rotate** [rouˈteıt] *v* **1**. fırlatmaq; **to ~ a wheel** təkəri fırlatmaq; **2**. fırlanmaq; *The earth rotates once every 24 hours Yer hər 24 saatda bir dəfə fırlanır*; **3**. növbələşmək, növbə ilə dəyişmək

**rotation** [rouˈteıʃn] *n* **1**. fırlanma; **the ~ of the earth on its axis** yerin öz oxu ətrafında fırlanması; **five ~s an hour** saatda beş dəfə fırlanma; **~s per minute** *tex*. bir dəqiqədə fırlanma miqdarı; **2**. dəyişmə, əvəzlənmə; **the ~ of the seasons** fəsillərin dəyişməsi; **3**. *k.t.* növbəli əkin; **the ~ of crops** əkinin növbələşməsi

**rotational** [rouˈteıʃnəl] *adj* dəyişən, növbələşən; **~ crops** növbələşən bitkilər

**rotor** [ˈroutəʳ] *n* **1**. *tex*. rotor *(maşınlarda fırlanan hissə)*; **2**. *dən*. lövbər

**rotten** [ˈrɔtn] *adj* **1**. çürümüş, xarab olmuş; qoxumuş, iylənmiş; lax; **~ wood** çürümüş taxta; **~ fruit** çürümüş/xarab olmuş meyvə; **~ meat** iylənmiş/qoxumuş ət; **~ eggs** lax yumurtalar; *The window frames are completely rotten Pəncərənin çərçivələri tamamilə çürükdür*; **2**. etibarsız, zəif; **~ ice** etibarsız/zəif buz; **~ rope** etibarsız



kəndir; **3**. pis, iyrənc; **~ weather** pis/iyrənc hava; *We had rotten weather all week Bütün həftə hava pis/iyrənc oldu; She got a rotten cold Ona çox pis soyuq olub/dəyib*; **4**. xəstə; **to feel ~** xəstə hiss etmək; **to look ~** xəstə görünmək; 5. korlanmış, pozulmuş; **the ~ system of administration** pozulmuş/ korlanmış idarə sistemi

**rottenly** [ˈrɔtnlı] *adv* alçaq, alçaqcasına, şərəfsizcəsinə; *He treats his wife rottenly O, arvadı ilə alçaqcasına rəftar edir*

**rottenness** [ˈrɔtnnıs] *n* çürüklük; laxlıq; iyrənclik

**rotter** [ˈrɔtəʳ] *n* yaramaz, alçaq, rəzil, əclaf *(adam); He's a complete rotter! O tamamilə alçaqdır/əclafdır!*

**rotund** [rouˈtʌnd] *adj* kök, girdə, yumru, yupyumru, koppuş

**rotundity** [rouˈtʌndıtı] *n* köklük, yumruluq, koppuşluq

**rouge[1]** [ru:ʒ] *n fr*. **1**. ənlik; **2**. dodaq pomadası

**rouge[2]** [ru:ʒ] *v* pomadalamaq, pomada sürtmək /çəkmək *(dodağa, üzə)*; **to ~** ***one's*** **lips/*****one's*** **cheeks** dodaqlarına/ yanaqlarına pomada sürtmək/çəkmək

**rough[1]** [rʌf] *n* **1**. qaba, kobud, ədəbsiz, nəzakətsiz *(adam)*, xuliqan, dələduz; **a gang of ~s** xuliqanlar/dələduzlar dəstəsi; **2**. ilkin forma, qaralama halı; *His plans are in the rough Onun planları ilkin formadadır/qaralama halındadır*; **3**. həyatın ağrı-acısı/enişi-yoxuşu; taleyin dönüklüyü; *In marriage you have to learn to take the rough with the smooth Evli olduqda gərək həyatın ağrısına-acısına dözməyi öyrənəsən*; **4**. kələ-kötür yer; **5**. çəltik, döyülməmiş/ qabığı alınmamış düyü

**rough[2]** [rʌf] *adj* **1**. kələ-kötür; **the ~ surface** kələ-kötür səth; **the ~ road** kələ-kötür yol; *The rough road made the cart shake Kələ-kötür yol arabanı silkələyirdi*; **2**. cod, qaba, sərt, kobud; **~ cloth** cod/qaba mahud; **~ food** qaba yem; **~ hands** kobud əllər; **~ answer** kobud cavab; **3**. təmizlənməmiş; aşılanmamış; **~ rice** təmizlənməmiş düyü; **~ leather** aşılanmamış dəri; **4**. cilalanmamış; rəndələnməmiş *(taxta haq.)*; **5**. kəskin; bərk; güclü; **~ voice** kəskin səs; **~ blow** güclü/bərk zərbə; **6**. ağır; **~ labour** ağır iş; **7**. acı; **~ luck** acı tale; **8**. səs-küylü, nadinc; dalaşqan; **a ~ child** nadinc uşaq; **9**. dalğalı, coşğun; **~ sea** coşğun/dalğalı dəniz;

◊ **the ~er sex** kişilər; **to take over a ~ road** *amer*. **1)** qulaqburması vermək; **2)** çətin vəziyyətə salmaq; **~ stuff** *amer*. **1)** fiziki təzyiq; **2)** kobud/qaba rəftar

**rough[3]** [rʌf] *v* **1**. kələ-kötür etmək; **2**. rəqibə qarşı kobudluq/qabalıq etmək *(futbol oyununda); He was sent off the field by the referee for roughing Kobudluq etdiyinə görə hakim onu meydandan qovdu*; **3**. qarışdırmaq, dolaşdırmaq, pırtlaşıq/kilkə salmaq *(saç və s. haq.)*; **4**. dalğalandırmaq, həyəcanlandırmaq; coşdurmaq; dalğalanmaq, coşmaq *(dəniz haq.); A stiff breeze is roughing up the sea Güclü külək dənizi dalğalandırır/coşdurur*; **to ~ in** cızmaq, qaralamasını hazırlamaq; *He roughed in his plan for us O öz planını bizim üçün cızdı*;

◊ **to ~** ***smb.*** **up the wrong way** bir kəsi əsəbiləşdirmək

**rough-and-ready** [ˈrʌfəndˈredı] *adj* başdansovma, tələm-tələsik/atüstü/tələsik edilmiş; **to do** ***smth.*** **in a ~ manner** bir şeyi tələm-tələsik etmək

**roughen** [rʌfn] *v* **1**. kobudlaşdırmaq, qabalaşdırmaq; kobudlaşmaq, qabalaşmaq; kələ-kötür olmaq; *Her hands have roughened Onun əlləri kobudlaşıb*; **2**. coşmaq, şiddət etmək, təlatümə gəlmək *(dəniz haq.)*; **3**. əsəbiləşdirmək, özündən çıxartmaq

**roughly** [ˈrʌflı] *adv* **1**. kobud, qaba; kobudcasına, qabacasına; **to treat** ***smb.*** **~** bir kəslə kobud/qaba davranmaq; **2**. səliqəsiz, başdansovma, saymazyana; **to paint ~** başdansovma rəngləmək; **3**. təxmini; təxminən, təqribən; **to estimate** ***smth.*** **~** bir şeyi təxmini qiymətləndirmək

**roughness** [ˈrʌfnıs] *n* **1**. kobudluq, qabalıq; **2**. kələ-kötürlük, əyri-üyrülük; **3**. kəskinlik, şiddət *(səs, rəng haq.)*; **4**. coşğunluq, təlatüm *(dəniz haq.)*; **5**. sərtlik *(iqlim, hava haq.)*

**Roumanian[1]** [ruˈmeınjən] *n* **1**. rumın; **the ~s** *top.i* rumınlar; **2**. rumın dili

**Roumanian[2]** [ruˈmeınjən] *adj* rumın; **the ~ language** rumın dili; **~ music/dance** rumın musiqisi/rəqsi

**round[1]** [raund] *n* **1**. göy qübbəsi; **2**. dairə, dairəşəkilli əşya; **3**. dilim, parça, tikə *(çörək və s. haq.)*; **4**. halay; **to dance in a ~** halay vurub oynamaq; **5**. fırlanma; dövran, dövr etmə; **earth's yearly ~** yerin illik dövr etməsi/dövranı; **6**. yoxlama, baş çəkmə; **doctor's ~** həkimin xəstəyə baş çəkməsi; **to go/to make the ~ of** yoxlamağa getmək, baş çəkmək; **7**. *hərb*. keşikçiləri yoxlamaq; **8**. gəzinti; **to make a ~ of the country** ölkəni gəzmək; **9**. qrup, dəstə; **a ~ of politicians** siyasətçilər qrupu/dəstəsi; **10**. *id*. bir oyun/əl/partiya;

◊ **a ~ of cheers/of applause** alqış gurultusu; **to go/to make the ~ of** dolaşmaq *(xəbər, şayiə)*

**round[2]** [raund] *adj* **1**. girdə, yumru, dəyirmi; şaraoxşar, şarvarı, şarşəkilli; **as ~ as a ball** şar kimi girdə/yumru; **2**. kök, dolu, koppuş; **~ cheeks** koppuş yanaqlar; **3**. təxmini *(məbləğ haq.)*; *My year's profit is about $5000 as a round Mənim*

*illik gəlirim təxminən 5000 dollardır*; **4.** səmimi, açıq, açıq-aydın;
◊ **a ~ peg in a square hole** öz yerində olmayan adam

**round³** [raund] *v* **1.** girdələmək, girdələnmək, yumrulamaq, yumrulanmaq, dəyirmilənmək; halqalanmaq; *Amazement rounded her eyes Təəccübdən onun gözləri halqalandı*; **2.** qurtarmaq, tamamlamaq; bitirmək; **3.** qulağını kəsmək *(itin)*; **4.** dönmək; *She rounded to look at me O döndü ki, mənə baxsın, O mənə baxmaq üçün döndü*; **to ~ off** tamamlamaq, qurtarmaq; **to ~ off negotiations** danışıqları qurtarmaq; **to ~ on** danlamaq, tənbeh etmək; **to ~ out 1)** yuvarlaqlaşdırmaq; **2)** kökəlmək; *She has rounded out O, kökəlib*

**round⁴** [raund] *adv* **1.** *Hərəkətin dairəvi istiqamətdə getdiyini göstərir.* **1)** *Azərbaycan türkcəsinə yerlik hal şəkilçiləri* **(-da, -də)** *tərcümə edilir:* **to go ~ in the circle** dairə içərisində fırlanmaq; *What are you hanging round for? d.d. Buralarda nə gəzirsən?/gəzirsiniz?*; **2)** *Azərbaycan türkcəsinə* **boyunca** *sözü ilə tərcümə edilir:* **to run ~** dairə boyunca qaçmaq; **to pass /to hand** ***smth.*** **~** bir şeyi dairə boyunca ötürmək/vermək; **2.** *Hərəkətin ətrafa yayılmasını bildirir: Azərbaycan türkcəsinə* **ətraf** *sözü və yönlük hal şəkilçiləri* **-a, -ə** *ilə tərcümə edilir: The news was soon carried round Xəbər tezliklə ətrafa yayıldı*; **3.** *Hərəkətin təkrar olunduğunu göstərir. Azərbaycan türkcəsinə* **yenə** *sözü və* **də** *ədatı vasitəsilə tərcümə edilir: Autumn /Winter came round Payız/Qış yenə də gəldi*; **4.** *Əksər hallarda Azərbaycan türkcəsinə tərcümə olunmur: The wheels turned round Təkərlər fırlandı*; **to deal ~** paylamaq *(kartı)*; *Hand round the papers Hamıya yazı işi ver/verin; Come round and see me Gəl/Gəlin məni gör/görün, Bizə qonaq gəl/gəlin; I'll call round at eight Mən saat səkkizdə gələcəm*

**round⁵** [raund] *prep* **1.** ətrafına, ətrafında; *The Moon revolves round the Earth Ay yerin ətrafına/ətrafında fırlanır; The wheel goes round an axle Təkər ox ətrafında fırlanır; The children were sitting round the table Uşaqlar stolun ətrafında oturmuşdular*; **2.** ətrafa; *Look round you Ətrafına/Ətrafınıza bax/baxın*; **3.** təxminən, təqribən; **~ midday** təxminən/təqribən günorta; **~ 1965** təxminən/təqribən 1965-ci ildə; **4.** haqqında, barəsində; **to write an article ~** ***smth.*** bir şey haqqında məqalə yazmaq; **to go ~ the house/the museum** evə/ muzeyə baxmaq; *They went round the museum Onlar muzeyə baxdılar*

**roundabout¹** [ˈraundəbaut] *n* **1.** karusel, fırlanğıc; **2.** dolanbac/dolayı yol; **3.** eyham, məcaz

**roundabout²** [ˈraundəbaut] *adj* **1.** dolayı, dolanbac; **to hear** ***smth.*** **in a ~ way** bir şeyi dolayı yolla eşitmək; **2.** eyhamlı, kinayəli; **3.** dolğun, cüssəli, boylu-buxunlu

**rounded** [ˈraundıd] *adj* girdələşdirilmiş, dəyirmiləşdirilmiş; girdə, yumru, dəyirmi

**roundish** [ˈraundıʃ] *adj* girdətəhər, yumrutəhər, girdəvarı, yumruvarı

**roundly** [ˈraundlı] *adv* **1.** açıqcasına, açıqdan-açığa, çəkinmədən, utanmadan, heç bir şeyi gizlətmədən; **to tell** ***smb.'s*** **fault ~** bir kəsin qüsurlarını açıqcasına/ heç bir şeyi gizlətmədən demək; **2.** kəskin, ciddi; şiddətli; *He was roundly rebuked Ona şiddətli töhmət verdilər*; **3.** tez, cəld, ciddiyyətlə, qızğın surətdə; **4.** tamamilə, tam; **to reckon ~ with** ***smb.*** bir kəslə tamamilə hesablaşmaq; **5.** təxminən, təqribən; ümumiyyətlə

**roundness** [ˈraundnıs] *n* girdəlik, dəyirmilik, yumruluq; köklük, dolğunluq, tosqunluq

**round-table** [ˈraundˈteıbl] *adj* dəyirmi stol; **~ conference** dəyirmi stol konfransı

**round-up** [ˈraundʌp] *n* **1.** heyvan üçün xalxal/ağıl; **2.** dövrələmə, dövrəyə alma; **3.** xəbərlərin məlumatı; **press ~** mətbuat məlumatı

**rouse** [rauz] *v* I **1.** oyatmaq; ayağa qaldırmaq *(həm də* **to ~ up**); *I was roused by the doorbell ringing Məni qapının zəng səsi oyatdı*; **to ~ the camp** düşərgəni həyəcanla ayağa qaldırmaq; **2.** təhrik etmək; **to ~ to action** hərəkətə təhrik etmək; **3.** qorxutmaq, qaldırmaq *(ov quşunu)*; **4.** doğurmaq, oyatmaq *(hiss və s.)*; **to ~ interest** maraq doğurmaq/ oyatmaq; **5.** acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək; qıcıqlandırmaq; **6.** qarışdırmaq

**rouse** [rauz] *v* II duzlamaq *(siyənək balığını)*

**rousing** [ˈrauzıŋ] *adj* **1.** ruhlandırıcı, ruhverici; ilhamlandırıcı, ilhamverici; **a ~ speech** ruhlandırıcı/ilhamverici nitq; **2.** güclü, şiddətli *(ocaq haq.)*; **3.** qızğın, canlı *(ticarət və s. haq.)*

**roustabout** [ˈraustəbaut] *n* fəhlə *(sirkdə, paroxodda və s. işləyən)*

**rout¹** [raut] *n* **1.** tam/qəti məğlubiyyət; **the total ~ of the enemy** düşmənin tam/qəti məğlubiyyəti; **2.** *arx.* böyük ziddiyyət; **3.** *arx.* səs-küylü izdiham/dəstə; **4.** *arx.* qaçmağa üz tutmuş düşmən

**rout²** [raut] *v* tam/tamamilə məğlub etmək; *They routed the enemy Onlar düşməni tamamilə məhv etdilər, Onlar düşməni darmadağın etdilər*

**route¹** [ru:t] *n* **1.** marşrut; **bus ~** avtobus marşrutu; *We went home by the shortest route Biz evə ən yaxın marşrutla getdik; Which route did you take? Sən/Siz hansı marşrutla getdin?/getdiniz?*; **2.** yol; **the Great Silk ~** böyük ipək yolu

**route²** [ru:t] *v (pr. p* **routing** *və ya* **routeing**; *pt, pp* **routed) 1.** müəyyən marşrutla yola salmaq /göndərmək; **2.** marşrut müəyyənləşdirmək /müəyyən etmək



**routine¹** [ru:ˈti:n] *n* müəyyənləşdirilmiş/ bərqərar olmuş rejim/qayda; **the day's ~** günün rejimi; **the ~ of business** bərqərar olmuş iş qaydası; **to do** ***smth.*** **as a matter of ~** bir şeyi müəyyən edilmiş qaydaya əsasən etmək; **to establish a new ~** yeni qayda yaratmaq/qoymaq

**routine²** [ru:ˈti:n] *adj* adi, adəti; cari; **a ~ task** adi vəzifə; **a ~ correspondence** cari xidməti yazışma

**rove** [rouv] *v* **1.** veyllənmək, sərgərdan gəzmək, sərsəri həyat keçirmək; avara-avara dolaşmaq; **to ~ the streets** küçələrdə avara-avara gəzmək/ veyllənmək; **2.** özündə olmamaq, azmaq, dolaşmaq *(fikir, baxış haq.)*; *His eyes roved over the pictures Onun gözləri şəkilləri süzdü/dolaşdı*

**rover** [ˈrouvəʳ] *n* avara, sərsəri, sərgərdan, yurdsuz *(adam)*

**row¹** [rau] *n* **1.** *d.d.* səs, səs-küy; mübahisə; **a family ~** ailə mübahisəsi; **to make a ~, to kick up a ~** səs-küy qaldırmaq; **2.** töhmət, tənbeh, bərk məzəmmət; **to get into a ~** məzəmmət edilmək

**row²** [rau] *v* **1.** dava/qalmaqal/qovğa salmaq, şuluqluq etmək; *They are always rowing Onlar həmişə dava/qalmaqal salırlar*; **2.** tənbeh etmək, danlamaq, töhmət vermək

**row¹** [rou] *n* I **1.** cərgə, sıra; **a ~ of trees/of houses** ağacların/evlərin cərgəsi; **a ~ of soldiers** əsgərlərin cərgəsi/sırası; **2.** cərgə *(teatrda və s.)*; **front ~ of the stalls** parterin ön/qabaq sırası/cərgəsi; **to sit in the front/back ~ at the cinema** kinoteatrda ön/arxa cərgədə oturmaq

**row** [rou] *n* II **1.** avar çəkmə; **2.** qayıqda gəzinti/gəzmə; **to go for a ~** qayıqda gəzməyə/gəzintiyə çıxmaq

**row²** [rou] *v* I cərgəyə düzmək/qoymaq

**row** [rou] *v* II **1.** avar çəkmək; **to ~ a boat** qayıqda avar çəkmək; **to ~ against the wind/stream** küləyə/axına qarşı avar çəkmək; **2.** qayıq yarışında iştirak etmək *(həm də* **to ~ a race**); **3.** qayıqla aparmaq/keçirmək; **to ~** ***smb.*** **across a river** bir kəsi qayıqla çaydan keçirmək; **to ~ for** qayıq yarışında yarışmaq *(bir kəslə)*;
◊ **to ~ against the wind/the stream** çətin işlə məhğul olmaq, çətin işə əl qatmaq/girişmək

**rowdily** [ˈraudılı] *adv* **1.** səs-küylə; gur; gurultu ilə, şiddətli; **2.** pozğuncasına, azğıncasına, əxlaqsızcasına

**rowdiness** [ˈraudınıs] *n* xuliqanlıq, dələduzluq, davakarlıq

**rowdy¹** [ˈraudı] *n* xuliqan, dələduz, davakar

**rowdy²** [ˈraudı] *adj* **(-ier, -iest) 1.** səsli, səsli-küylü; qızğın, gur; **a ~ game** səs-küylü oyun; **~ mountain brooks** gur dağ çayları; **2.** pozğun, azğın, yava, yolunu azmış; əxlaqsız

**rowdyism** [ˈraudıızm] *n* **1.** xuliqanlıq, dələduzluq; **2.** şuluqluq, pozğunluq; ədəbsizlik, azğınlıq

**rowlock** [ˈrɔlək] *n dən.* avar yeri *(qayıqda)*

**royal¹** [ˈrɔıəl] *n* kral ailəsinin üzvü; **the young ~s** kral ailəsinin gənc üzvləri

**royal²** [ˈrɔıəl] *adj* **1.** kral; **the ~ family** kral ailəsi; **~ title** kral rütbəsi; **~ power** kral hakimiyyəti; **2.** kralın himayəsində olan; krala aid; **Royal Academy** Kral Akademiyası; **Royal Society** Kral Elmi Cəmiyyəti; **3.** ingilis; **Royal Air Force** ingilis hərbi-hava qüvvələri; **Royal Navy** ingilis hərbi-dəniz qüvvələri; **4.** *d.d.* dəbdəbəli, təmtəraqlı, calallı, cah-calallı; çox gözəl; **~ welcome** dəbdəbəli qəbul; **~ view** çox gözəl mənzərə/görünüş; **to have a ~ time** vaxtını çox gözəl/dəbdəbəli keçirmək; **5.** çox böyük/iri, nəhəng, azman, zorba; **of ~ dimensions** çox böyük/iri ölçülər

**royalism** [ˈrɔıəlızm] *n* kralpərəstlik, padşahpərəstlik, royalizm, monarxizm

**royalist** [ˈrɔıəlıst] *n* kralpərəst, padşahpərəst, royalist, monarxist, şahsevər

**royally** [ˈrɔıəlı] *adj* **1.** krala/şaha layiq, kral/şah kimi; **2.** *d.d.* çox gözəl/yaxşı, dəbdəbə ilə, təmtəraqla; *We were royally entertained Bizi çox gözəl/yaxşı əyləndirdilər*

**royalty** [ˈrɔıəltı] *n* **1.** kral ləyaqəti; **2.** kral hakimiyyəti; **3.** kral ailəsi; *top.i* kralın ailə üzvləri; **4.** əzəmət, həşəmət, şahanəlik, cah-calal; böyüklük; **5.** kral malikanəsi/mülkü; krallıq; **6.** müəllif qonorarı *(hər bir satılan kitabdan faiz hesabı ilə verilən)*; **7.** pyesin müəllifi üçün ayrılmış məbləğ *(toplanmış puldan)*; **8.** yeraltı sərvətlərdən istifadə hüququ üçün verilən ödəmə/haqq

**rub¹** [rʌb] *n* **1.** sürtünmə; **2.** sürtmə; ovxalama; **to give** ***smth.*** **a good ~** bir şeyi yaxşı-yaxşı sürtmək; **3.** təmizləmə; **the ~ of a brush** şotka ilə təmizləmə; **4.** sürtülmüş/sürtülüb yara edilmiş yer; **5.** manеə, əngəl, çətinlik; **the ~s and worries of life** həyatın əngəlləri və iztirabları; **6.** təhrik etmə, qızışdırma

**rub²** [rʌb] *v* **(-bb-) 1.** silmək; **to ~** ***one's*** **eyes** gözlərini silmək; *He rubbed his eyes O, gözlərini sildi; Rub the glass with a damp cloth Şüşəni nəm əski ilə sil/silin*; **to ~ the surface dry** səthi silib qurutmaq; **2.** sürtmək; **to ~** ***one's*** **hands** əllərini bir-birinə sürtmək *(sevincdən)*; **to ~** ***one's*** **hands with soap** əllərinə sabun sürtmək, əllərini sabunlamaq; **to ~** ***one's*** **chest with ointment** sinəsinə maz sürtmək; *My shoes are rubbing my heels Mənim çəkməm dabanlarımı*

sürtür; *The dog rubbed its head against my legs İt başını mənim qıçlarıma sürtdü*; 3. təmizləmək, cilalamaq *(həm də* **to ~ up**); 4. toxunmaq, dəymək; *He rubbed his coat (against) some wet paint O, paltosunu yaş rəngə toxundurub/batırıb*; **to ~ along** *d.d.* 1) yola getmək; *We rubbed along very unhappily Biz yola gedə bilmədik*; 2) çətin vəziyyətdən çıxmaq; qurtarmaq; 3) yavaş-yavaş irəliləmək; *We manage to rub along Biz bir təhər yaşayırıq*; **to ~ away** silmək; *She tried to rub her tears away with the back of her hand O, göz yaşlarını əlinin arxası ilə silməyə çalışdı*; **to ~ down** 1) silmək, silib qurutmaq; 2) atı təmizləmək, qaşovlamaq; 3) cilalamaq; 4) *d.d.* axtarmaq *(həbs olunanın üst-başını)*; **to ~ off** təmizləmək; **to ~ the rust** pası təmizləmək

**rubbed** [rʌbd] *adj* köhnəlmiş, yırtılmış; köhnə, sürtülmüş; ~ **furniture** köhnəlmiş/köhnə/sürtülmüş mebel

**rubber**[1] ['rʌbər] *n* I 1. kauçuk; **natural/ synthetic** ~ təbii/sintetik kauçuk; 2. pozan, rezin; 3. *pl amer.* qaloş; 4. *id.* şayba

**rubber** ['rʌbər] *n* II 1. masajist, masaj edən; 2. camadar; 3. hamam dəsmalı/ məhrəbası; 4. sumbata

**rubber**[2] ['rʌbər] *adj* 1. rezin; ~ **gloves/ boots/bullets** rezin əlcək/çəkmə/güllələr; 2. kauçuk; ~ **plantations** kauçuk plantasiyaları

**rubber**[3] ['rʌbər] *v* **(-bb-)** 1. rezinləşdirmək, rezin hopdurmaq, rezinlə örtmək; 2. kauçuk yığmaq

**rubbing-stone** ['rʌbɪŋstoun] *n* bülöv daşı

**rubbish** ['rʌbɪʃ] *n* 1. zibil, zir-zibil; *The dustman hasn't collected the rubbish yet Zibildaşıyan hələ zibili yığmayıb*; 2. cəfəngiyyat; *Don't talk rubbish! Cəfəngiyyat danışma/danışmayın!*

**rubbishy** ['rʌbɪʃɪ] *adj* cəfəng, boş, mənasız; yaramaz; ~ **TV serials** mənasız televiziya serialları

**rubble** ['rʌbl] *n* çay/çaylaq daşı, tikinti daşı *(yonulmuş)*; çınqıl; **a road built on a foundation of** ~ çınqıl özül üstündə çəkilmiş yol

**ruby**[1] ['ru:bɪ] *n* 1. yaqut *(qiymətli daş)*; 2. yaqut rəngi, tünd qırmızı rəng

**ruby**[2] ['ru:bɪ] *adj* yaqut, yaqut rəngli, yaqut kimi qırmızı; **a ~ ring** yaqut qaşlı üzük; ~ **velvet** yaqut rəngli velvet *(parça növü)*; ~ **lips** yaqut kimi qırmızı dodaqlar

**ruby**[3] ['ru:bɪ] *v* yaqutla/yaqut rəngində bəzəmək

**ruck** [rʌk] *n* rəiyyət, qara camaat, avam/adi xalq

**rudder** ['rʌdər] *n* 1. sükan; 2. rəhbəredici prinsip

**rudderless** ['rʌdəlɪs] *adj* 1. sükansız; 2. rəhbərsiz, nəzarətsiz; *The government is rudderless Dövlət rəhbərsizdir/nəzarətsizdir*

**ruddiness** ['rʌdɪnɪs] *n* allıq, qırmızılıq

**ruddy**[1] ['rʌdɪ] *adj* 1. al; ~ **cheeks** al yanaqlar; 2. qırmızı; ~ **wine** qırmızı şərab/çaxır

**ruddy**[2] ['rʌdɪ] *v (pt, pp* **-ied**) 1. al/qırmızı boyamaq; *Sunlight ruddied windows Günəş işığı pəncərələri al şəfəqə boyadı*; 2. allanmaq, qızarmaq

**rude** [ru:d] *adj* **(-r, -st)** 1. kobud, qaba; ədəbsiz; həqarətli, alçaldıcı, təhqiredici; **a ~ reply** kobud/həqarətli cavab; **to be ~ to** *smb.* bir kəsə qarşı kobud olmaq, bir kəsi təhqir etmək; 2. tərbiyəsiz, cahil, avam, qanacaqsız; 3. xam, emal edilməmiş; **cotton in its ~ state** xam/emal edilməmiş pambıq; 4. cilalanmamış, kobud *(dil, üslub haq.)*; **a ~ language/ style** kobud dil/üslub; 5. kəskin, xoşagəlməz *(səs haq.)*; 6. güclü *(külək haq.)*

**rudely** ['ru:dlɪ] *adv* 1. təhqiredici bir şəkildə, həqarətlə, kobudcasına, qabacasına; kobud, qaba; **to speak** ~ kobud/qaba danışmaq; *Don't speak so rudely to your father Atanla/Atanızla belə kobud danışma/danışmayın; He laughed rudely O, təhqiredici bir tərzdə güldü*; 2. yöndəmsiz/kobud bir tərzdə, yonulmamış; 3. təxmini

**rudeness** ['ru:dnɪs] *n* kobudluq, qabalıq; tərbiyəsizlik; *The girl was offended by his rudeness Onun kobudluğu/qabalığı qızın xətrinə dəydi, Onun kobudluğundan qız incidi*

**rudiment** ['ru:dɪmənt] *n* 1. elementar/ əsas biliklər; **the ~ of arithmetic** hesabın əsasları; 2. başlanğıc, rüşeym; ~ **of civilization** mədəniyyətin/sivilizasiyanın başlanğıcı

**rudimentary** [ˌru:dɪ'mentrɪ] *adj* 1. ibtidai, elementar, başlanğıc; ən sadə/asan/bəsit; **a ~ education** ibtidai təhsil; *He could received only a rudimentary education O ancaq ibtidai təhsil ala bildi*; **a ~ knowledge of botany** botanika haqqında elementar bilik; 2. inkişafdan qalmış; **a ~ organ** inkişafdan qalmış orqan

**rue** [ru:] *v (pr. p* **rueing** *və ya* **ruing**; *pt, pp* **rued**) təəssüf etmək, heyfsilənmək; peşman olmaq; **to ~ the day/the hour when**... ...günə/saata təəssüf etmək

**rueful** ['ru:fl] *adj* qəmli, qəmgin, qüssəli, kədərli, pərişan; **a ~ smile** qəmli/qüssəli/ kədərli təbəssüm

**ruefully** ['ru:fəlɪ] *adv* qəmgincəsinə, pərişan/kədərli bir tərzdə; qəmli-qəmli, qüssəli-qüssəli, kədərli-kədərli, pərişan bir halda

**ruffian** ['rʌfɪən] *n* huliqan; başkəsən, qatil, quldur; yaramaz; **a hared ~** muzdla tutulmuş qatil/başkəsən; **a gang of ~s** bir dəstə xuliqan; *He was attacked in a dark street by a band of ruffians Qaranlıq bir küçədə ona bir dəstə huliqan hücum etdi*

**ruffianism** ['rʌfjənɪzm] *n* huliqanlıq, banditlik, quldurluq

**ruffianly** ['rʌfɪənlɪ] *adj* huliqan, bandit; ~ **appearance** huliqan/bandit görkəmi

**ruffle**[1] ['rʌfl] *n* I 1. büzmə, oborka; 2. büzməli krujeva manjet *(paltar qolunun qatlanmış hissəsi)*, büzməli krujeva vorotnik/yaxalıq; 3. zərif dalğa/ləpə/qırış *(suyun üzündə)*



**ruffle** ['rʌfl] *n* II çaxnaşma, vəlvələ, həyəcan, toqquşma, dalaşma

**ruffle**[2] ['rʌfl] *v* I 1. büzmələmək, büzmək *(paltarı və s.)*; 2. qarışdırmaq, dolaşdırmaq, kilkə /pırtlaşıq salmaq *(saçı və s.)*; 3. hirsləndirmək, acıqlandırmaq, əsəbiləşdirmək; hirslənmək, acıqlanmaq, əsəbiləşmək; **to ~ smb.'s temper** bir kəsi özündən çıxartmaq; 4. narahat etmək, dincliyini əlindən almaq; *Their minds were ruffled by the unexpected news Gözlənilməz xəbər onları çaş-baş saldı*; 5. zəif-zəif dalğalandırmaq/ləpələndirmək *(suyu)*; *The wind ruffles the water Külək suyu zərif-zərif dalğalandırır*; 6. cəld vərəqləmək *(kitabın səhifələrini)*; 7. cəld qatışdırmaq *(kartı)*

**ruffle** ['rʌfl] *v* II 1. coşmaq, şiddət etmək *(külək, dəniz və s. haq.)*; 2. azğınlıq etmək, qalmaqal/qarışıqlıq salmaq;
◊ **to ~ smb.'s feathers** bir kəsi narahat/məyus etmək

**rug** [rʌg] *n* 1. xalça, palaz; **a ~ in front of the fire** ocağın qabağına salınan xalça; 2. şal, çiyin şalı

**Rugby** ['rʌgbɪ] *n id.* reqbi *(futbol oyununun bir növü)*

**rugged** [rʌgɪd] *adj* 1. kələ-kötür, dərə-təpə, nahamar; ~ **bark** kələ-kötür qabıq; ~ **country** dərə-təpə ölkə; ~ **mountains** dərə-təpə dağlar; 2. cadar-cadar, qırış-qırış; **a fierce ~ face** qırış-qırış qorxunc sifət; 3. cilalanmamış, qaba, kobud; ~ **manners** kobud/qaba davranışlar; 4. ağır, çətin; ~ **life** ağır/çətin həyat; ~ **times** ağır/çətin zamanlar/vaxtlar

**ruggedly** ['rʌgɪdlɪ] *adv* qabacasına, kobudcasına, kobud, qaba

**ruggedness** [rʌgɪdnɪs] *n* 1. nahamarlıq, kələ-kötürlük; 2. qabalıq, kobudluq; 3. qırışıqlıq

**ruin**[1] ['ru:ɪn] *n* 1. tələf/həlak/ məhv/puç olma; **the ~ of** ***one's*** **hopes** ümidlərin puç olması/heçə çıxması; **to bring to ~** məhv etmək; 2. xarabalıq, viranəlik, xarabaxana, xarabazarlıq; **the ~s of the castle/ancient city** qəsrin/qədim şəhərin xarabalıqları; **to lay a town in ~s** şəhəri xarabazarlığa çevirmək; *The abbey is now a ruin Monastır indi xarabaxanadır/ xarabazarlıqdır*; 3. namusuna/şərəfinə toxunma, namusunu ləkələmə, rüsvay etmə *(qadın haq.)*

**ruin**[2] ['ru:ɪn] *v* 1. dağıtmaq, uçurtmaq, yıxmaq, viran etmək/qoymaq, xaraba qoymaq; puç/yox etmək; *The island has been ruined by tourism Turizm adanı xaraba/viran qoydu; The storm ruined the crops Tufan məhsulu məhv/puç etdi*; **to ~ smb.'s reputation** bir kəsin şöhrətini puç etmək; **to ~** ***one's*** **life** həyatını məhv/puç etmək; 2. namusunu ləkələmək, namusuna/şərəfinə toxunmaq, biabır/rüsvay etmək *(qadını, qızı)*; **to ~ a girl** qızın namusunu ləkələmək; 3. var-yoxdan çıxmaq, dilənçi halına salmaq

**ruinate** ['ru:ɪneɪt] *v* 1. dağıtmaq, yıxmaq, uçurtmaq, viran etmək, xaraba qoymaq; yox/puç /məhv/alt-üst etmək; 2. var-yoxdan çıxarmaq, iflasına səbəb olmaq, iflasa uğratmaq

**ruination** [ˌru:ɪ'neɪʃn] *n d.d.* 1. fəlakət, qəza, bədbəxt hadisə; tələf/məhv/həlak olma; 2. var-yoxdan tam çıxma

**ruined** ['ru:ɪnd] *adj* 1. dağılmış, dağıdılmış, uçmuş, uçulmuş, xaraba qalmış; **a ~ church** dağılmış/uçmuş kilsə; **a ~ city** xaraba qalmış şəhər; 2. məhv edilmiş, korlanmış; ~ **health** korlanmış səhhət/ sağlamlıq; 3. viran edilmiş, xaraba qoyulmuş, dağıdılmış; **a ~ country** viran edilmiş/xaraba qoyulmuş ölkə

**ruinous** ['ru:ɪnəs] *adj* 1. məhvedici, tələfedici; fəlakətli, zərərli; dağıdıcı; **the ~ effects of the strike** tətilin dağıdıcı təsirləri; 2. uçmuş, dağılmış, viran qalmış; ~ **castles** dağılmış/viran qalmış qəsrlər

**rule**[1] [ru:l] *n* 1. qayda; **the ~s of football** futbol oyunu qaydaları; ~ **of the road** yol hərəkəti qaydası; **to observe/to obey the ~s** qaydalara əməl/riayət etmək; 2. adət; *My rule is to have dinner at five Saat beşdə nahar etmək mənim adətimdir*; 3. hakimiyyət, dövlət; **during the ~ of Shah Ismayil** Şah İsmayılın hakimiyyəti dövründə; 4. nizamnamə; **~s of the exchange** birja nizamnaməsi;
◊ *There's no rule without an exception İstisnasız qayda yoxdur*

**rule**[2] [ru:l] *v* 1. idarə/hökmranlıq etmək, hökm sürmək; **to ~ (over) the country** ölkəni idarə etmək; **to ~ the market** bazarda hökmranlıq etmək; 2. rəhbərlik etmək; *The headmaster ruled the school with a firm hand Direktor məktəbə dəmir intizamla rəhbərlik edirdi*; 3. nəzarət etmək; **to ~** ***one's*** **actions** öz hərəkətlərinə nəzarət etmək; 4. *hüq.* həll etmək *(məsələni)*, qərar/hökm çıxarmaq; 5. xətt çəkmək; **to ~ paper** kağıza xətt çəkmək;
◊ **to ~ the roast** idarə/rəhbərlik etmək, əmr/sərəncam/göstəriş vermək; **to ~ with a rod of iron** dəmir əllə idarə etmək

**ruler** ['ru:lər] *n* 1. hökmdar, hakim, idarə edən; 2. xətkeş

**ruling**[1] ['ru:lɪŋ] *n* 1. idarə/rəhbərlik etmə; idarə; 2. qərar, qətnamə; 3. xətt/cızıq çəkmə

**ruling**[2] ['ru:lɪŋ] *adj* 1. hakim, idarə edən, hökmran; **the ~ classes** hakim siniflər; 2. mövcud olan, cari; ~ **prices** mövcud olan/cari qiymətlər

**rumble**[1] ['rʌmbl] *n* 1. guruldama, gumbuldama, gurultu, şaqqıltı; gumbultu, uğultu; **the ~ of**

**thunder** göy gurultusu/şaqqıldaması; **the ~ of an earthquake** zəlzələnin uğultusu; 2. narazılıq, şikayət, deyinmə; **~s of opposition** etirazı/şikayəti ifadə etmə

**rumble[2]** [ˈrʌmbl] *v* 1. guruldamaq *(göy)*, quruldamaq *(qarın)*, gurultu salmaq, gumbuldamaq; 2. şırıldamaq; 3. ucadan danışmaq

**rumbustious** [rʌmˈbʌstʃəs] *adj d.d.* səsli-küylü, gurultulu; *The children got very rumbustious after lesson Dərsdən sonra uşaqlar yaman səsli-küylü oldular*

**ruminant[1]** [ˈru:mınənt] *n zool.* gövşəyən heyvan; *Cows and sheep are ruminants İnəklər və qoyunlar gövşəyən heyvanlardır*

**ruminant[2]** [ˈru:mınənt] *adj* 1. gövşəyən; **~ animals** gövşəyən heyvanlar; 2. fikirli, dalğın

**ruminate** [ˈru:mıneıt] *v* 1. gövşəmək; saqqız çeynəmək; 2. **(about, on, over)** dərindən fikirləşmək/düşünmək, götür-qoy etmək; **to ~ over a plan** plan üzərində dərindən düşünmək, planı götür-qoy etmək

**rumination** [ˌru:mıˈneıʃn] *n* 1. gövşəmə, saqqız çeynəmə; 2. fikirləşmə, düşünmə, götür-qoy etmə

**ruminative** [ˈru:mınətıv] *adj* düşüncəli, fikirli, dalğın; **a man of ~ habits** fikirli/dalğın adam

**ruminatively** [ˈru:mınətıvlı] *adv* dalğın, fikirli, fikirli-fikirli, dalğın/fikirli bir tərzdə; **to speak ~** fikirli-fikirli danışmaq

**rummage[1]** [ˈrʌmıdʒ] *n* 1. axtarış, axtarma; 2. zir-zibil, cır-cındır, əsgi-üsgü, dəyərsiz şeylər

**rummage[2]** [ˈrʌmıdʒ] *v* 1. axtarmaq, eşələyib axtarmaq *(həm də* **to ~ about**); **to ~ in a desk** yazı stolunu eşələyib axtarmaq; **to ~ a house from top to bottom** evi başdan-başa axtarmaq, evin altını üstünə çevirmək *(bir şeyi tapmaq üçün)*; 2. gömrük yoxlanışı keçirmək *(gəmidə)*; qaçaq mal axtarmaq; 3. ciddi surətdə tədqiq etmək/öyrənmək

**rumor** [ˈru:məʳ] *n amer.* = **rumour[1,2]**

**rumour[1]** [ˈru:məʳ] *n* şayiə, söhbət; *There is a rumour Şayiə gəzir ki,... Deyirlər ki,...*

**rumour[2]** [ˈru:məʳ] *v* şayiə yaymaq, danışmaq, demək; *It's rumoured that there will be a meeting next week Deyirlər ki, gələn həftə mitinq olacaq*

**rump** [rʌmp] *n anat.* yanbız, sağrı; *He slapped the horse on the rump O, atın sağrısına/yanbızına şappıldatdı, O şappıltı ilə atın sağrısına/yanbızına vurdu*

**rumple** [ˈrʌmpl] *v* 1. əzmək, bürüşdürmək; **to ~ *one's* clothes** paltarını əzmək/bürüşdürmək; 2. qarışdırmaq, dolaşdırmaq, kilkə salmaq; **to ~ *smb.'s* hair** bir kəsin saçını dolaşdırmaq

**rumpus** [ˈrʌmpəs] *n d.d.* səs-küy, hay-küy, qalmaqal, mərəkə, vəlvələ, çaxnaşma

**run[1]** [rʌn] *n* 1. qaçış, qaçma; **at a ~** qaçaraq; **to come at a ~** qaçaraq gəlmək; **on the ~** hərəkətdə; **to be on the ~ all day** bütün günü hərəkətdə olmaq; **to keep *smb.* on the ~** 1) bir kəsə dayanmağa imkan verməmək; 2) bir kəsə rahatlıq verməmək; **to keep the enemy on the ~** *hərb.* düşmənə möhkəmlənməyə imkan verməmək; **to break into a ~** qaçmaq, qaçmağa üz qoymaq; **to go for a short ~ before breakfast** səhər yeməyindən əvvəl bir az qaçmaq; **to give *smb.* a ~** bir kəsə qaçmağa imkan vermək; *I was giving my dog a run in the park Mən itimə parkda qaçmağa imkan verdim*; 2. qısa səfər /səyahət; **a ~ to London** Londona qısa səfər/səyahət; 3. reys, marşrut; **ship's ~** gəminin marşrutu/reysi; 4. müddət, dövr, vaxt, çağ; **a ~ of success/of good luck** müvəffəqiyyət/uğur dövrü; **a ~ of ill luck** uğursuzluq dövrü/çağı /vaxtı; **a ~ of wet/bad weather** yağmurluq/pis hava dövrü; **a long ~ of power** hakimiyyətdə uzun müddət qalma; 5. tiraj *(kitab və s. haq.)*; **a ~ of three thousand (copies)** üç min nüsxə tiraj; 6. sürü; dəstə *(heyvan və s. haq.)*; 7. karvan, sürü *(balıq haq.)*; **a ~ of fish** balıq karvanı /sürüsü; 8. tələb, tələbat; **a ~ on a book** kitaba tələb; *There is a great run on this novel Bu romana böyük tələb var*; 9. *d.d.* icazə, istifadə etmək hüququ; **to have the ~ of *smb.'s* house** bir kəsin evindən istifadə etmək hüququna malik olmaq; **to give *smb.* the (free) ~ of *one's* house /books** bir kəsə sərbəst olaraq öz evindən/kitablarından istifadə etməyə icazə vermək; 10. *k.t.* ağıl *(qoyun və s. üçün)*; 11. axın, güclü qabarma *(su haq.)*; 12. *amer.* kiçik çay; 13. *mus.* rulada *(melodiyanın mahiranə surətdə ifa edilən hissəsi)*; 14. gediş; **the ~ of the disease/ events** xəstəliyin/hadisələrin gedişi; 15. nümayiş etdirmə, göstərmə *(filmi, tamaşanı)*; **the first ~ of the film** filmin ilk nümayişi, filmin premyerası;

◊ **at a ~** dalbadal, bir-birinin ardınca/ dalınca; **in the long ~** nəhayətdə, son nəticədə

**run[2]** [rʌn] *adj* 1. maye, duru, əridilmiş; **~ butter** əridilmiş yağ; **~ metal** əridilmiş metal; 2. süzülmüş; **~ honey** süzülmüş bal

**run[3]** [rʌn] *v (***-nn-**; *pt* **ran** [ræn], *pp* **run** [rʌn]) I *Əsas fel kimi:* 1. qaçmaq; **to ~ fast/slowly/like a deer** cəld/yavaş/maral kimi qaçmaq; **to ~ up and down the stairs** pilləkənlərlə yuxarı və aşağı qaçmaq; **to ~ out of the room** otaqdan bayıra qaçmaq; **to ~ to *smb.* for help** kömək üçün bir kəsin yanına qaçmaq; **to ~ after *smb.*** bir kəsin dalınca qaçmaq; *He cannot run because he has a weak heart Onun ürəyi zəif olduğundan qaça bilmir; Can you run as fast as Tom? Sən/Siz Tom kimi bərk qaça bilərsənmi?/bilərsinizmi?*; 2. qovmaq; sürmək *(mal-qaranı)*; *Don't run me too fast Məni belə bərk qovma/qovmayın*; **to ~ cattle** heyvanı sürmək *(örüşə)*; 3. qaçıb getmək, qaçıb qurtarmaq *(həm də* **to ~ away/off**); **to ~ from *smb./smth.*** bir kəsdən/şeydən qaçmaq; 4. hərəkət etmək, getmək; *Trams run on rails Tramvay rels üstündə gedir; Motor-cars run along ordinary roads Avtomobillər adi yolla gedir*; 5. işləmək, gedib-gəlmək *(müəyyən istiqamət üzrə); Trams run every three minutes Tramvaylar hər üç dəqiqədən bir işləyir; Buses run daily Avtobuslar hər gün işləyir; This bus runs between Chicago and New York Bu avtobus Çikaqo və Nyu York arasında işləyir*; 6. ötmək, keçmək *(vaxt haq.); Time runs fast Vaxt tez ötür/keçir*; 7. yayılmaq, bürümək; *A rumour ran through the town Şayiə bütün şəhərə yayıldı; The fire ran through the building Alov bütün binaya yayıldı/binanı bürüdü*; 8. uzanmaq; **to ~ north and south** şimala və cənuba/quzeyə və güneyə uzanmaq; 9. çəkmək; **to ~ a fence round a house** evin ətrafına hasar çəkmək; 10. müəyyən müddət üçün etibarlı olmaq; *This law/contract runs for seven years Bu qanun/müqavilə yeddi il etibarlıdır*; 11. axmaq, axıb getmək, tökülmək; xəfif-xəfif axmaq; *The River Kur runs into the Caspian Sea Kür çayı Xəzər dənizinə axır /tökülür; The tears ran down her cheeks Yaş onun yanaqlarından axdı; The water is running into the bath Su hamama axır/tökülür; This river runs smoothly Bu çay sakit axır; Blood ran in torrents Qan sel kimi axdı; This tap/barrel runs Bu kran/çəllək axır; His nose was running Onun burnu axırdı*; 12. ərimək; *The butter ran Yağ əridi; The ice-cream began to run Dondurma əriməyə başladı*; 13. qarışmaq; **to ~ into another** bir-birinə qarışmaq; *The colours ran into one another Rənglər bir-birinə qarışdı*; 14. tökmək; **to ~ water/wine /milk into a glass** stəkana su/şərab/süd tökmək; 15. fırlanmaq; *A wheel runs Təkər fırlanır*; 16. deyilmək; *Her letter runs Onun məktubunda deyilir*; 17. keçmək, aşmaq *(manеəni)*; **to ~ a blockade** maneəni keçmək/aşmaq; 18. rəhbərlik/başçılıq etmək *(müəssisəyə və s.)*; **to ~ a factory** fabrikə rəhbərlik etmək; **to ~ the external affairs of the state** dövlətin xarici siyasətinə/işlərinə rəhbərlik etmək; 19. idarə etmək; **to ~ the house** evi idarə etmək; **to ~ a car** maşın idarə etmək; 20. qoymaq, aparmaq *(təcrübə haq.); He'll run this experiment O bu təcrübəni aparacaq*; 21. işləmək *(maşın haq.); The motor runs smoothly Mühərrik rahat işləyir*; 22. iştirak etmək *(yarışda)*; **to ~ in a race** qaçış/cıdır yarışında iştirak etmək; 23. göstərmək, nümayiş etdirmək *(filmi və s.); They ran this play six times Onlar bu pyesi altı dəfə göstərdilər*; 24. getmək, davam etmək; *This film has been running for a year Bu film bir ildir ki, gedir*; 25. izləmək, dalınca qaçmaq *(heyvanın)*; **to ~ a stag** maralı izləmək; **to ~ a fox** tülkünün dalınca qaçmaq; 26. məruz qalmaq *(riskə, təhlükəyə və s.)*; **to ~ risks** riskə məruz qalmaq, risk etmək; 27. nəşr/çap etmək, yerləşdirmək *(qəzetdə, jurnalda və s.)*; **to ~ a story on the third page** hekayəni üçüncü səhifədə çap etmək/yerləşdirmək; 28. səsə qoyulmaq, seçkidə iştirak etmək *(vəzifə tutmaq üçün)*; **to ~ in an election** seçkidə iştirak etmək; **to ~ for parliament/for president** parlament /prezident seçkilərində iştirak etmək; 29. naqqallıq /boşboğazlıq etmək, çənə/laqqırtı vurmaq; 30. əritmək *(metalı)*; 31. təsadüfən rast gəlmək; **to ~ across *smb./smth.*** bir kəsə/şeyə təsadüfən rast gəlmək; *I ran across him in the street Mən təsadüfən ona küçədə rast gəldim*; **to ~ against *smb.*** bir kəsə qarşı getmək /hərəkət etmək; **to ~ at *smb./smth.*** bir kəsə/şeyə hücum etmək, bir kəsin/şeyin üstünə atılmaq; **to ~ at *smb.* with a knife** bıçaqla bir kəsə hücum etmək; **to ~ into debt** borca düşmək; **to ~ into danger/into trouble** təhlükəyə/bəlaya düşmək; **to ~ into *smb.*** təsadüfən bir kəsə rast gəlmək; **to ~ into an old friend** təsadüfən əski /köhnə dosta rast gəlmək; **to ~ out of *smth.*** bir şeyi tükətmək/ qurtarmaq; **to ~ out of ammunition** *hərb.* döyüş sursatını tükətmək/qurtarmaq; **to ~ through *smth.*** bir şeyi ötəri oxumaq/gözdən keçirmək; **to ~ through the text** mətni ötəri oxumaq/gözdən keçirmək

**run** [rʌn] *v (***-nn-**; *pt* **ran** [ræn], *pp* **run** [rʌn]) II *Bağlayıcı fel kimi:* 1. olmaq, təşəkkül tapmaq, əmələ gəlmək; **to ~ cold** soyumaq; **to ~ dry** qurumaq; **to ~ high** 1) qalxmaq; 2) dalğalanmaq, ləpələnmək *(dəniz haq.): The sea runs high Dəniz dalğalanır*; 3) coşmaq, şiddətlənmək *(ehtiras haq.): Passions/ Feelings ran high Ehtiraslar/Hisslər coşdu*; 2. qalxmaq, artmaq *(qiymət haq.)*; **to ~ low** 1) aşağı enmək /düşmək; 2) tükənmək, qurtarmaq; *Supplies ran low Ehtiyatlar tükəndi/qurtardı*; **to ~ hot** qızmaq; **to ~ mad** dəli olmaq; 3. olmaq; -dır, -dir, -dur, -dür; *The apples ran large/ big this year Bu il almalar iridir/ böyükdür*; **to ~ about** 1) vurnuxmaq, boş-boşuna əlləşmək/vurnuxmaq /çalışmaq; 2) oynamaq, oynaqlamaq; **to let the dogs ~ about** itlərə oynaqlamaq üçün imkan vermək; **to ~ along** getmək; *It's late, I must run along Gecdir, mən getməliyəm*; **to ~ away** 1) qaçmaq, qaçıb getmək; *Don't run away and leave me alone Qaçıb getmə/getməyin, məni tək*

*buraxma/ buraxmayın*; **to ~ away from** ***smb.*** bir kəsdən qaçmaq; **to ~ away from facts** dəlillərə/faktlara göz yummaq; **to ~ away from school** məktəbdən qaçmaq; *He ran away with my purse O mənim pul kisəmi götürüb qaçdı*; **to ~ down 1)** dayanmaq *(maşın və s. haq.)*; *The clock has run down Saat dayanıb*; **2)** yorulmaq; **to look/to feel much ~ down** çox yorğun görünmək/hiss etmək; **3)** tutmaq, qovub/yetişib tutmaq, yaxalamaq; *The police ran him down Polis qaçıb onu tutdu*; **to ~ in 1)** dəymək, baş çəkmək; *Run in and see me this evening Bu axşam mənə dəy/dəyin*; **2)** dayanmaq *(vağzalda)*, yaxınlaşmaq *(vağzala)*; *The train ran in at the station Qatar vağzala yaxınlaşdı*; **3)** həbs etmək; *He was run in for stealing Onu oğurluğa görə həbs etdilər. O, oğurluq üstündə həbs olundu/edildi*;

◊ **to ~ the streets** sahibsiz/kimsəsiz olmaq *(uşaq haq.)*; **to ~ (a) temperature** qızdırması yüksək olmaq; *I think I am running a temperature Mənə belə gəlir ki, mənim qızdırmam qalxır*; **to ~** ***smb.*** **into difficulties** bir kəsi çətinliyə salmaq; **to ~ to cover** təhlükədən xilas olmaq; **to ~ with the hare and hunt the hounds** *at. söz.* ≅ ikibaşlı oyun oynamaq

**runabout** [ˈrʌnəbaut] *n* **1.** avara, səfil; **2.** balaca avtomobil/motorlu qayıq

**runaway**[1] [ˈrʌnəweɪ] *n* **1.** qaçaq, qaçqın; **2.** dezertir, fərari; **3.** qoşulub qaçma *(qız haq.)*

**runaway**[2] [ˈrʌnəweɪ] *adj* **1.** qaçmış, qaçaq, qaçqın; **a hostel for ~ children** qaçmış uşaqlar üçün yataqxana; **2.** nəzarətdən çıxmış *(at, maşın və s.)*; **3.** asan; **~ victory** *id.* asan qələbə

**rung**[1] [rʌŋ] **to ring** *felinin pp forması*

**rung**[2] [rʌŋ] *n* **1.** nərdivanın pillələri; **2.** təkərin dəndənəsi; **3.** cəmiyyətdə mövqe/mərhələ, pillə; **the first ~ of the career** karyeranın birinci mərhələsi/pilləsi

**runner** [ˈrʌnəʳ] *n* **1.** qaçan, qaçışçı, qaçma yarışının iştirakçısı; **a long-distance ~** uzaq məsafəyə qaçan; **a marathon ~** marafon yarışının iştirakçısı; **the list of ~s** qaçışçıların siyahısı; **2.** rısak, yort/löhrəm at; **3.** kuryer, ayaqçı, çapar, qasid; **4.** *bot.* bığcıq *(çiyələkdə)*; **5.** *bot.* zoğ, cavan budaq; **6.** *tex.* rotor *(maşınlarda fırlanan hissə, val)*; **7.** saz maşın

**running**[1] [ˈrʌnɪŋ] *n* **1.** qaçma, yüyürmə; **2.** yarış; reys; **3.** işləmə *(maşın haq.)*;

◊ **to be in the ~** udmağa şansı olmaq; **to be out of the ~** udmağa şansı olmamaq, oyundan çıxmaq; **to take up the ~ 1)** *id.* başçılıq etmək; **2)** qabağa çıxmaq; **3)** təşəbbüsü ələ almaq

**running**[2] [ˈrʌnɪŋ] *adj* **1.** qaçış; **a ~ path/ track** qaçış yolu; **2.** axan; **~ water** axan su; **3.** dənəvər; **~ soil** dənəvər torpaq; **4.** irinləyən; **~ sore** irinləyən yara; **5.** rəvan, səlis, sərbəst; **~ metre** sərbəst vəzn *(şerdə)*; **6.** cari; **~ account** cari hesab; **~ expenses** cari xərclər; **~ repairs** cari təmir; **7.** aramsız, arasıkəsilməz, ardıcıl; **a ~ fire of questions** aramsız/ arasıkəsilməz suallar axını; **8.** dalbadal; bir-birinin ardınca/dalınca; **three days/ weeks/months/years** ***etc.*** **~** üç gün /həftə/ ay/il *və s.* dalbadal; **four times ~** dörd dəfə dalbadal; *I've won three times running Mən üç dəfə dalbadal qalib gəldim/uddum*

**runway** [ˈrʌnweɪ] *n* **1.** *av.* uçma və enmə meydançası; **2.** heyvanların saldığı cığır; **3.** *id.* yüyürmək üçün cığır/zolaq

**rupee** [ru:ˈpi:] *n* rupi *(Hindistanda, Pakistanda və Şri-Lankada pul vahidi)*

**rupture**[1] [ˈrʌptʃəʳ] *n* **1.** ixtilaf, nifaq, ikitirəlik; **a ~ between two friends** iki dost arasında ixtilaf; **deep ~ within the party** partiya daxilində dərin ixtilaf; **2.** kəsilmə, qırılma *(əlaqə haq.)*; **~ of diplomatic relations** diplomatik əlaqələrin kəsilməsi/qırılması; **3.** partlama; **~ of the heart** ürəyin partlaması; **the ~ of a blood-vessel** qan damarının partlaması; **4.** *tib.* yırtıq, qrija; sınıq, sınıq yeri

**rupture**[2] [ˈrʌptʃəʳ] *v* **1.** kəsmək; kəsilmək *(əlaqə və s. haq.)*; **to ~ relations** əlaqələri kəsmək; *Our relationship has been ruptured Bizim əlaqəmiz kəsilib*; **2.** nifaq/ixtilaf/ikitirəlik salmaq; **3.** *tib.* yırtmaq, cırmaq; qrija əmələ gətirmək; *He'll rupture a blood-vessel if he goes on shouting like that Bu cür qışqırmaqda davam etsə, o, qan damarını yırtacaq/ cıracaq*

**ruptured** [ˈrʌptʃəd] *adj* **1.** yırtılmış, cırılmış; sınmış; **a ~ appendix** yırtılmış appendiks *(kor bağırsaq)*; **2.** qrijadan əziyyət çəkən

**rural**[1] [ˈruərəl] *n* kənd sakini/əhli

**rural**[2] [ˈruərəl] *adj* kənd; **~ scenery** kənd mənzərəsi; **~ customs** kənd adətləri; **~ economy** kənd təsərrüfatı

**ruse** [ru:z] *n* **1.** biclik, hiyləgərlik, hiylə, fənd; **~ of war** hərbi biclik/fənd; **2.** fırıldaq, kələk, dələduzluq

**rush**[1] [rʌʃ] *n* I **1.** cəld hərəkət; hücum, həmlə, axın, təzyiq; **a ~ of wind** küləyin ani şiddəti; **a ~ of customers** alıcıların axını; **to make a ~ at** ***smb.*** bir kəsin üstünə atılmaq; **2.** basabas; tələsmə, qaç-qov; *We needn't leave yet; what's all the rush? Biz hələ getmirik; bu qaç-qov/tələsmə nəyə lazım?*; *I hate shopping during the Christmas rush Mənim Milad bayramı basabasında bazarlıq etməkdən zəhləm gedir*; **3.** axma, yığılma *(qan və s. haq.)*; **a ~ of blood to the head** qanın başa yığılması/axması; **4.** can atma, …dalınca qaçma; **a ~ for wealth** zənginliyə/var-dövlətə can atma; **a ~ for gold** qızıl dalınca qaçma; **~ of armaments** qızğın silahlanma



**rush** [rʌʃ] *n* II **1.** *bot.* qamış, qarğı; **2.** boş/ əhəmiyyətsiz/mənasız şey; **not to care a ~** qəti/əsla maraqlanmamaq; **not to give a ~ for** ***smth.*** bir şeyə əsla əhəmiyyət verməmək; *His friendship is not worth a rush Onun dostluğu bir qəpiyə dəyməz*

**rush**[2] [rʌʃ] *adj* təxirsiz, təcili, təxirəsalınmaz; **~ order** təcili/ təxirəsalınmaz sifariş; **~ work/job** təcili iş; **~ hour** qızğın vaxt; **~ period/season** biçinin qızğın dövrü

**rush**[3] [rʌʃ] *v* I **1.** atılmaq, tullanmaq, sıçramaq; **to ~ at** ***smb./smth.*** bir kəsin/ şeyin üstunə atılmaq/sıçramaq; *The bull rushed at him Buğa onun üstünə atıldı*; **2.** soxulmaq; hücum çəkmək; axışıb gəlmək; tökülüşmək, tökülüşüb gəlmək; *They rushed into the room Onlar otağa soxuldular; The children rushed out of school Uşaqlar məktəbdən bayıra tökülüşdülər*; **3.** tez ötüb keçmək; *The days rushed by us and our holidays were soon ended Günlər tez ötüb keçdi və bizim məzuniyyətimiz tezliklə sona çatdı/qurtardı*; **4.** tez/tələsik keçirmək; **to ~ a bill through Parliament** qanun layihəsini tələsik parlamentdən keçirmək; **5.** tələsik/tez-tələsik hərəkət etmək; **to ~ to a conclusion** tez-tələsik nəticə çıxartmaq; **6.** təcili/təxirəsalınmaz surətdə yerinə yetirmək; **to ~ an order** sifarişi təcili/təxirəsalınmaz surətdə yerinə yetirmək; **7.** tələsdirmək, qısnamaq; bir iş görməyə məcbur etmək *(bir kəsi)*; **to ~** ***smb.*** **into an undertaking** bir kəsi məcburən bir müəssisəyə cəlb etmək; **to ~ a people into war** bir xalqı məcburən müharibəyə cəlb etmək; **8.** tələsdirmək, tez hərəkət etməyə/ getməyə məcbur etmək; **9.** *id.* rəqib qapısına hücum etmək; **10.** soymaq, qopartmaq *(müştəridən)*; *How much did he rush you for this? Bunun üçün o səndən/sizdən nə qədər qopartdı?*

**rush** [rʌʃ] *v* II **1.** qamış/qarğı döşəmək, qamışla/qarğı ilə örtmək; **2.** qamışla/ qarğı ilə hörmək; **3.** qamışdan/qarğıdan bir şey qayırmaq *(səbət və s.)*

**rushy** [ˈrʌʃɪ] *adj* **1.** qamış, qarğı; qamışlı, qarğılı; **2.** qamış/qarğı basmış; **a ~ place** qamış/qarğı basmış yer, qamışlıq, qarğılıq

**rusk** [rʌsk] *n* suxarı

**russet**[1] [ˈrʌsɪt] *n* qırmızıya/sarıya çalan qəhvəyi rəng

**russet**[2] [ˈrʌsɪt] *adj* qırmızı/sarı rəngə çalan; **the ~ autumn leaves** qırmızı/sarı rəngə çalan payız yarpaqları

**Russian**[1] [rʌʃn] *n* **1.** rus; **the ~s** *top.i* ruslar; **2.** rus dili

**Russian**[2] [rʌʃn] *adj* rus; **the ~ language** rus dili; **~ folklore** rus folkloru

**Russianize, -ise** [ˈrʌʃənaɪz] *v* ruslaşdırmaq

**Rusify** [ˈrʌsɪfaɪ] *v* = **Russianize**

**rust**[1] [rʌst] *n* **1.** pas; **2.** pas rəngi; **3.** yaddaşın/əqli fəaliyyətin zəifləməsi *(qocalıqdan və s.)*; **4.** *bot.* pas xəstəliyi *(bitkilərdə)*

**rust**[2] [rʌst] *v* **1.** paslanmaq, pas atmaq/kəsmək /tutmaq; *Gold doesn't rust Qızıl paslanmır/pas atmır/tutmur*; **2.** zəiflətmək, kütləşdirmək *(yaddaşı, ağlı, zəkanı)*; **3.** pas xəstəliyinə tutulmaq *(bitki haq.)*

**rusted** [ˈrʌstɪd] *adj* paslı, pas basmış/kəsmiş /tutmuş/atmış; *The pipe was badly rusted Boru çox pis paslanmışdı/pas atmışdı*

**rustic**[1] [ˈrʌstɪk] *n* **1.** kənd sakini, kəndli; **2.** avam/cahil/ədəbsiz/kobud adam; *You can't expect these rustics to understand Shakespeare Bu cahil/avam adamların Şekspiri başa düşəcəyini gözləmək olmaz*

**rustic**[2] [ˈrʌstɪk] *adj* **1.** kənd; **~ charm** kənd gözəlliyi/cazibədarlığı; *The village has a certain rustic charm Kəndin özünəməxsus gözəlliyi var*; **2.** sadə, sadədil, sadəlövh *(adam haq.)*; **~ simplicity** kənd sadəliyi; **3.** kobud, qaba, yonulmamış; **~ speech/manners** kobud nitq/davranışlar; **4.** qabığı alınmamış, rəndələnməmiş; **a ~ bench** rəndələnməmiş taxtadan qayrılmış skamya

**rusticate** [ˈrʌstɪkeɪt] *v* **1.** kənddə yaşamaq; **2.** müvəqqəti olaraq universitetdən xaric etmək *(tələbəni)*; **3.** kənd adətləri/ davranışları aşılamaq; kobudlaşdırmaq, qabalaşdırmaq; **4.** *mem.* yonulmamış daşla hörmək

**rustication** [ˈrʌstɪkeɪʃn] *n* **1.** kəndə göndərmə/sürgün etmə; **2.** kənd həyatı; **3.** universitetdən müvəqqəti xaric etmə *(tələbəni)*; **4.** *mem.* yonulmamış daşla hörmə

**rusticity** [rʌsˈtɪsɪtɪ] *n* **1.** kobudluq, qabalıq, mədəniyyətsizlik, ədəbsizlik, tərbiyəsizlik *(davranış və s. haq.)*; **2.** avamlıq, sadəlövhlük, sadədillik; **3.** sadəlik, adilik; **the ~ of country towns** əyalət şəhərlərinin sadəliyi/adiliyi; **4.** kənd adətləri/qaydaları/əxlaqı; kənd həyatı; **5.** qaba/kobud nitq

**rustictobacco** [ˈrʌstɪktəˈbækou] *n bot.* maxorka, tənbəki

**rustle**[1] [ˈrʌsl] *n* xışıltı, xışıldama; **to hear a ~ in the bush** kolluqda xışıltı eşitmək; **the ~ of paper/leaves** kağızın/yarpaqların xışıltısı; **the ~ of silk** ipəyin xışıldaması /xışıltısı

**rustle**[2] [ˈrʌsl] *v* **1.** xışıldamaq; xışıldatmaq; *The leaves rustled under foot Yarpaqlar ayaq altında xışıldayırdı; The wind rustles the leaves Külək yarpaqları xışıldadırdı*; **2.** *amer. d.d.* mal-qara oğurlamaq, mal-qaranı qovub aparmaq

**rustler** [ˈrʌsləʳ] *n* mal-qara və ya at oğurlayan adam

**rustless** [ˈrʌstlɪs] *adj* paslanmayan, pas tutmayan/kəsməyən/atmayan; ~ **steel** paslanmayan metal

**rustling** [ˈrʌstlɪŋ] *n* xışıltı; **the ~ of dry leaves** quru yarpaqların xışıltısı

**rust-proof**[1] [ˈrʌstpru:f] *adj* pasa davamlı, paslanmayan, pas atmayan/ kəsməyən/ tutmayan

**rust-proof**[2] [ˈrʌstpru:f] *v* pasa davamlı etmək, pas tutmamaq, paslanmamaq

**rusty** [ˈrʌstɪ] *adj* I **1**. paslı, pas tutmuş/ kəsmiş/atmış; ~ **needles/nails/pipes** *etc.* paslı iynələr /mismarlar/borular *və s.*; **2**. unudulmuş, yaddan çıxmış; *My English is a little rusty Mən ingilis dilini bir az unutmuşam*; **3**. pas rəngli; **4**. rəngi qaçmış/solmuş *(parça haq.)*; **5**. köhnə, köhnəlmiş; ~ **jokes** köhnə/köhnəlmiş lətifələr; **6**. pas xəstəliyi tutmuş *(bitki haq.)*

**rusty** [ˈrʌstɪ] *adj* II **1**. tərs, inad; harın *(at haq.)*; **to ride/to run** ~ tərslik etmək, tərsliyi/tərs damarı tutmaq *(həm də adam haq.)*; **2**. *d.d.* tündməcaz, əsəbi; tezhirslənən, acıqlı, hirsli, qəzəbli; **to cut up** ~ qəzəblənmək, acıqlanmaq, qeyzlənmək; *Don't get rusty Hirslənmə/ Hirslənməyin, Özündən/Özünüzdən çıxma / çıxmayın*

**rut**[1] [rʌt] *n* I **1**. təkər izi; çuxur, çökək, çala; **2**. köhnəpərəstlik, köhnəlik, ətalət; **3**. *tex.* nov, navalça

**rut** [rʌt] *n* II *fiziol.* cinsi oyanma *(erkək heyvanlarda)*

**rut**[2] [rʌt] *v* (**-tt-**) iz/çuxur açmaq

**ruthless** [ˈru:θlɪs] *adj* amansız, qəddar, insafsız, rəhmsiz, zalım, daşürəkli; **a ~ dictator** zalım/qəddar/insafsız diktator; **to be utterly ~** tam amansız/rəhmsiz/ insafsız olmaq

**ruthlessly** [ˈru:θlɪslɪ] *adv* amansızcasına, insafsızcasına, rəhmsizcəsinə, qəddarcasına

**ruthlessness** [ˈru:θlɪsnɪs] *n* insafsızlıq, rəhmsizlik, amansızlıq, qəddarlıq

**rye**[1] [raɪ] *n* **1**. *bot.* çovdar; **2**. *amer. d.d.* çovdar çörəyi

**rye**[2] [raɪ] *adj* çovdar; ~ **bread** çovdar çörəyi; ~ **whisky** çovdar viskisi





**S s** [es] *n (pl* **S's, s's** [ˈesɪz]) *ingilis əlifbasının 19-cu hərfi*

**-s** [-es] *ismin cəm şəkilçisi (saitlərdən və cingiltili samitlərdən sonra* [z], *kar samitlərdən sonra* [s] *oxunur*: **boys** [bɔɪz], **girls** [gə:lz]; **cats** [kæts]); *Azərbaycan türkcəsində ismin* **-lar, -lər** *cəm şəkilçilərinə müvafiq gəlir*

**-s'** [s, z, ɪz] *yiyəlik hal şəkilçisi (cəm isimlərdə): sait və cingiltili samitlərdən sonra* [z], (**the boys' names** [ðə bɔɪz neɪmz] oğlanların adları, **the dogs' tailes** [ðə dɔgz teɪlz] itlərin quyruqları), *kar samitlərdən sonra* [s] *oxunur* (**the cats' ears** [kæts ɪəz] pişiklərin qulaqları). *Azərbaycan türkcəsində* **-lar/-lər** + *ismin* **-ın, -in, -un, -ün** *yiyəlik hal şəkilçilərinə uyğun gəlir*

**-'s**[1] [z,s] *suff* **1. is, was, has** *fel formalarının qısaldılmış şəkli:* ***He is = He's; She has = She's; He was = He's***; **2. us** *əvəzliyinin qısaldılmış forması:* ***Let us... = Let's...***

**-'s**[2] [z, s] *yiyəlik hal şəkilçisi (sait və cingiltili samitlərdən sonra* [z], *kar samitlərdən sonra* [s] *oxunur*: **the boy's name** [-bɔɪz-], **the dog's tail** [-dɔgz-], **the cat's ears** [-kæts-]); *Azərbaycan türkcəsində ismin* **-ın, -in, -un, -ün** *yiyəlik hal şəkilçilərinə uyğun gəlir*

**Sabbath** [ˈsæbəθ] *n* müqəddəs istirahət günü *(yəhudilərdə – şənbə, xristianlarda – bazar, müsəlmanlarda – cümə)*

**sable**[1] [ˈseɪbl] *n* I **1**. *zool.* samur; **2**. samur xəzi

**sable** [ˈseɪbl] *n* II **1**. *şair.* qara rəng; **2**. *pl* yas/matəm paltarı

**sable**[2] [ˈseɪbl] *adj* **1**. samur; ~ **fur** samur xəzi; **2**. samur xəzindən tikilmiş; **a ~ coat** samur xəzindən tikilmiş palto; **3**. qara, tünd; qaranlıq, zülmət; **Africa's ~ sons** Afrikanın qara oğulları; ~ **night** qaranlıq/zülmət gecə

**sabot** [ˈsæbou] *n fr* taxta başmaq; sabo

**sabotage**[1] [ˈsæbəta:ʒ] *n* **1**. sabotaj *(qəsdən işə mane olma)*; **economic ~** iqtisadi sabotaj; **2**. təxribat; diversiya, təxribatçılıq; **to perform an act of ~** diversiya/təxribat törətmək

**sabotage**[2] [ˈsæbəta:ʒ] *v* **1**. sabotaj etmək/törətmək, mane olmaq *(işə)*; **2**. diversiya/təxribat təşkil etmək; **3**. pozmaq, müvəffəqiyyətsizliyə uğratmaq *(işi, planı və s.)*; **to ~ a scheme of work** iş planını pozmaq

**saboture** [ˌsæbəˈtə:ʳ] *n fr* sabotajçı, sabotaj edən, sabotajla məşğul olan *(adam)*

**sabra** [ˈsa:brə] *n* İsrail vətəndaşı *(İsraildə doğulmuş adam)*

**sabre**[1] [ˈseɪbəʳ] *n* **1**. qılınc; **to rattle the ~** qılınc oynatmaq; **2**. süvari, atlı/süvari əsgər; **3**. qılıncbazlıq, qılınc təlimi

**sabre**[2] [ˈseɪbəʳ] *v* **1**. qılıncla kəsmək/doğramaq; **2**. qılınc oynatmaq

**sabre-rattler** [ˈseɪbəˌrætləʳ] *n* **1**. militarist; **2**. müharibə qızışdıran *(adam)*

**sabre-rattling** [ˈseɪbəˌrætlɪŋ] *n* **1**. müharibə təbliğ etmə; **2**. hərbi qüvvə tətbiq etmək təhlükəsi

**sack**[1] [sæk] *n* I **1**. kisə, torba, çuval, meşok; **a ~ of coal/wheat/potatoes** bir kisə kömür/buğda /kartof; **2**. tuluq; **3**. döşək;

◊ ~ **of coals** qara bulud; **to give the ~ 1)** işdən çıxartmaq; **2)** elçini rədd etmək; **3)** aldatmaq, kələk gəlmək; **to get the ~** işdən çıxarılmaq

**sack** [sæk] *n* II talan, qarət, qarət etmə, çapıb talama, soyma

**sack**[2] [sæk] *v* I **1**. kisəyə/meşoka tökmək/yığmaq; **to ~ potatoes** kartofu kisəyə/meşoka yığmaq; **2**. *d.d.* çıxarmaq *(işdən)*; **3**. *d.d.* mənimsəmək, cibə salmaq; **to ~ money** pul mənimsəmək

**sack** [sæk] *v* II talan/qarət etmək, soymaq, çalıbçapmaq *(zəbt edilmiş şəhəri)*; **to ~ the city** şəhəri qarət etmək/ soymaq/çapıb-talamaq

**sackful** [ˈsækful] *n (pl* **-fuls**) kisə dolusu; **two ~s of flour** iki kisə un; **~s of money** kisə dolusu pul

**sacred** [ˈseɪkrɪd] *adj* **1**. müqəddəs; ~ **duty** müqəddəs vəzifə/ borc; **to hold** ***smth.*** ~ bir şeyi müqəddəs kimi anmaq/ xatırlamaq; *There is nothing sacred for/with him Onun üçün müqəddəs heç nə/heç şey yoxdur;* **a ~ animal/tree** müqəddəs heyvan/ağac; **2**. sarsılmaz, möhkəm, pozulmaz, davamlı; ~ **laws** sarsılmaz/möhkəm/pozulmaz qanunlar; **3**. toxunulmaz; *The person of ambassador is sacred Səfirin şəxsiyyəti toxunulmazdır*

**sacredly** [ˈseɪkrɪdlɪ] *adv* göz bəbəyi kimi, möhkəm surətdə, hörmətlə; **to preserve an oath ~** anda ciddi riayət etmək

**sacrifice**[1] [ˈsækrɪfaɪs] *n* **1**. qurban; fədakarlıq; **useless ~** mənasız qurban; **noble ~** əsl fədakarlıq; **to make/to accept ~s** qurbanlar vermək; **to give** ***one's*** **life as a ~ for** ***one's*** **country** həyatını vətəninə qurban vermək; **to fall a ~ to** ***smth.*** bir şeyin qurbanı olmaq; **to make a ~ for** ***one's*** **children** uşaqlarının qurbanı olmaq, özünü uşaqlarının qurbanı etmək; **2**. qurban, qurban kəsmə; qurbanlıq; ~ **fires** qurbanlıq tonqalları; **a ~ to the Gods** Allahlara qurban vermə; **to make a ~ of an ox** öküzü qurban kəsmək/vermək;

◊ **the great/the last/the supreme ~** vətən uğrunda qurban

**sacrifice**[2] [ˈsækrɪfaɪs] *v* **1**. qurban vermək, qur-

ban/fəda etmək; **to ~ *one's* life/oneself/everything to save *one's* child** uşağını xilas etmək üçün öz həyatını/özünü/hər şeyi qurban vermək; *He sacrificed his whole life to the cause of revolution O bütün ömrünü/həyatını inqilabi işə qurban verdi*; **to ~ a piece** fiquru qurban vermək *(şahmat oyununda)*; 2. qurban kəsmək; **to ~ a sheep/a bull/a camel** qoyun/buğa/dəvə qurban kəsmək; *They sacrificed a lamb Onlar quzu qurbanı kəsdilər*; 3. *tic.* ziyanına satmaq

**sacrificial** [ˌsækrɪˈfɪʃl] *adj* 1. qurbanlıq; **a ~ lamb /sheep/ bull/camel,** *etc.* qurbanlıq quzu/qoyun/buğa/dəvə *və s.*; 2. zərərli, ziyanlı, ziyan gətirən *(qiymət haq.)*

**sacrilege** [ˈsækrɪlɪdʒ] *n din.* kafirlik, küfr; təhqir etmə *(müqəddəs sayılan bir şeyi)*; **to commit ~** təhqir etmək *(müqəddəs yeri)*

**sacrum** [ˈseɪkrəm] *n (pl* **-ra**) *anat.* omba sümüyü

**sad** [sæd] *adj (-dder, -ddest)* 1. qəmli, qəmgin, qüssəli, kədərli, pərişan, məyus; **to make *smb.* ~** bir kəsi məyus/ pərişan etmək; bir kəsi kədərləndirmək/ qüssələndirmək; **a ~ story** kədərli/qəmli hekayə; **a ~ song** qəmli/kədərli/qəmgin mahnı; **a ~ music** qəmli/qəmgin musiqi; **a ~ look** qəmli/kədərli/pərişan görkəm; *Why is she looking so sad? Nə üçün o belə qəmli/qüssəli görünür?*; *John is sad because his father has died Atası öldüyünə görə Con kədərlidir/qüssəlidir*; 2. acınacaqlı, pis; **a ~ state of affairs** işlərin acınacaqlı vəziyyəti; 3. dəhşətli, çox pis, müdhiş; **a ~ fate** çox pis/müdhiş tale; **to come to a ~ end** çox pis qurtarmaq; **~ drunkard** içkiyə mübtəla olan əyyaş;

◊ **~ dog** avara, veyl; nadinc, dəcəl, şuluqçu, dələduz, fırıldaqçı

**sadden** [ˈsædn] *v (əsas. məchulda işlənir)* 1. qəmləndirmək, kədərləndirmək, qüssələndirmək, mütəəssir etmək; 2. qəmlənmək, kədərlənmək; qüssələnmək, mütəəssir olmaq; *We were all saddened by her death Biz hamımız onun ölümündən kədərləndik/ qüssələndik/mütəəssir olduq*

**saddle**[1] [ˈsædl] *n* 1. yəhər; **flat ~** yastı yəhər; **hunting ~** ingilis yəhəri; **to be in the ~** at minmək; 2. oturacaq *(velosipeddə və s.)*; 3. bel çuxuru *(heyvanlarda)*; 4. *coğr.* gəzdək, dağ çökəyi, dağın təpəsindəki çökək;

◊ **to be in the ~** 1) başçılıq/idarə/rəhbərlik etmək; 2) hakimiyyətə gəlmək; **to be cast/thrown from the ~** 1) vurulub yəhərdən salınmaq; 2) rəhbər işdən çıxarılmaq/ kənarlaşdırılmaq

**saddle**[2] [ˈsædl] *v* 1. yəhərləmək *(həm də* **to ~ up**); **to ~ a horse/a mule** at/qatır yəhərləmək; 2. yükləmək, dalına yük çatmaq; 3. *məc.* qoymaq, götürmək, atmaq, yıxmaq; **to ~ heavy responsibility on/upon *smb.*** bir kəsin üstünə ağır məsuliyyət qoymaq; **to ~ oneself with other people's troubles** başqa adamların qayğılarını öz boynuna/üzərinə götürmək

**saddle-bag** [ˈsædlbæg] *n* 1. xurcun; 2. velosipedin, motosikletin oturacağının arxasına qoyulan çanta

**saddle-bow** [ˈsædlbou] *n* yəhər qaşı

**saddle-cloth** [ˈsædlklɔθ] *n* yəhəraltı, tərlik

**saddle-girth** [ˈsædlgə:θ] *n* tapqır, qarınaltı

**saddle-horse** [ˈsædlhɔ:s] *n* minik atı

**saddler** [ˈsædləʳ] *n* 1. sərrac, yəhərqayıran *(usta)*; 2. *amer. d.d.* minik atı

**saddlery** [ˈsædlərɪ] *n* 1. sərraclıq; 2. sərracxana, sərrac emalatxanası

**saddle-sore** [ˈsædlsɔ:] *n* yəhərin açdığı yara/döyənək *(at minənlərdə)*

**saddle-tree** [ˈsædltri:] *n* yəhər qaltağı

**sadism** [ˈsædɪzm] *n* sadizm *(başqasına əziyyət verməkdən həzz alma)*

**sadist** [ˈsædɪst] *n* sadist *(başqasına əziyyət verməkdən həzz alan adam)*

**sadly** [ˈsædlɪ] *adv* 1. qəmli, kədərli, qüssəli, pərişan, qəmli-qəmli, qüssəli-qüssəli, pərişan halda, həzin-həzin; **to sing ~** qəmli-qəmli/həzin-həzin mahnı oxumaq; 2. heyif ki, əfsus ki; *Sadly our plan failed Heyif ki, bizim planımız baş tutmadı/pozuldu*

**sadness** [ˈsædnɪs] *n* qəm, qüssə, kədər, dərd, hüzn; **real ~** həqiqi qəm/qüssə/kədər/hüzn; *It was a great sadness to her that she never had a child Onun heç uşağının olmaması ona böyük dərd idi*

**safari** [səˈfa:rɪ] *n (pl* **safaris**) safari *(ov ekspedisiyası: xüs. Şərqi və Orta Afrikaya gedən)*; **on ~** ovda; **to go on ~** ova getmək; **to be on ~** ovda olmaq; **to return from (a) ~** ovdan qayıtmaq

**safe**[1] [seɪf] *n* 1. seyf, dəmir şkaf; 2. soyuducu, anbar *(ərzaq saxlamaq üçün)*

**safe**[2] [seɪf] *adj (-r, -st)* 1. təhlükəsiz, qorxusuz; **to be ~** təhlükəsiz olmaq; **to feel ~** özünü təhlükəsiz hiss etmək; *The crisis is over and the patient is now safe Böhran keçdi, indi xəstənin həyatı təhlükədən sovuşub*; *He is safe from starvation Onu aclıq təhlükəsi gözləmir*; **to make the world ~ for peace** dünyada sülhü təmin etmək; **a ~ place** təhlükəsiz/qorxusuz yer; 2. sağ-salamat; **~ arrival** sağ-salamat gəlib çıxma; 3. etibarlı; **a ~ partner** etibarlı partnyor/tərəfdaş; **in ~ hands** etibarlı əllərdə; *The rope is not safe Bu kəndir etibarlı/möhkəm deyil*; 4. *d.d.* şübhəsiz, yəqin; **a ~ winner** şübhəsiz/yəqin qalib; *He is a safe first O şübhəsiz birinci yer tutacaq*; *Our candidate is safe to win the election Bizim namizəd, şübhəsiz, seçkini udacaq/seçkidə qalib gələcək*; 5. ehtiyatlı, ehtiyatkar; **a ~ driver** ehtiyatlı sürücü; **~ policy** ehtiyatlı siyasət; **a ~ man** ehtiyatlı/ehtiyatkar adam;

◊ **~ and sound** sağ və salamat; **in ~ custody, ~ in gaol** barmaqlıqlar arasında, həbsxanada

**safeguard**[1] [ˈseɪfga:d] *n* 1. qarantiya, zaminlik, zəmanət, təminat; təhlükəsizlik tədbiri; **~ against accidents** bədbəxt hadisələrə qarşı təhlükəsizlik tədbiri; **~ against disease** xəstəliyə qarşı təhlükəsizlik tədbirləri; **to obtain ~s against *smth.*** bir şeyə qarşı qarantiya/təminat almaq; 2. *hərb.* qoruma, mühafizə; mühafizə dəstəsi



**safeguard**[2] [ˈseɪfga:d] *v* 1. mühafizə etmək, qorumaq; **to ~ *smb.'s* rights** bir kəsin hüquqlarını mühafizə etmək/ qorumaq; **to ~ *smb.'s* interests** bir kəsin maraqlarını qorumaq; **to ~ the environment** ətraf mühiti mühafizə etmək/qorumaq; 2. *hərb.* təmin/himayə etmək

**safekeeping** [ˈseɪfˌki:pɪŋ] *n* saxlama, saxlanc; **to be in ~** saxlanmaq, saxlancda olmaq; **to give *smth.* for ~** bir şeyi saxlamağa/saxlamaq üçün vermək

**safely** [ˈseɪflɪ] *adv* 1. sağ-salamat; rahat; **to go/to come ~** sağ-salamat getmək/gəlmək; **to bring *smth.* ~** bir şeyi sağ-salamat gətirmək; *The parcel arrived safely Bağlama sağ-salamat gəlib çıxdı/gəldi*; 2. möhkəm; **to keep *smth.* ~** bir şeyi möhkəm saxlamaq; 3. qətiyyətlə; *I can safely say that the work will be finished by the first of January Mən qətiyyətlə/inamla deyə bilərəm ki, iş yanvar ayının birinə qədər qurtaracaq*

**safety** [ˈseɪftɪ] *n* 1. təhlükəsizlik; **public ~** ictimai təhlükəsizlik; **to danger/to menace/to threaten ~** asayişi təhlükə altında qoymaq; **road ~** yol təhlükəsizliyi, küçə hərəkətinin təhlükəsizliyi; *Safety first! Hər şeydən əvvəl təhlükəsizliyə riayət et!/edin!* 2. sağlıq, salamatlıq; sağ-salamatlıq; sağ-salamat qalma; **in ~** sağ-salamat; **to travel/to get home in ~** sağ-salamat evə çatmaq; **to keep *smth.* in ~** bir şeyi sağ-salamat/salamat saxlamaq;

◊ **to play for ~** 1) səhvsiz/sərrast oynamaq; 2) risk etmədən görmək *(işi)*

**safety belt** [ˈseɪftɪbelt] *n* 1. təhlükəsizlik kəməri; 2. *av.* təhlükəsizlik kəmərini bağlama

**safety-catch** [ˈseɪftɪkætʃ] *n* 1. *tex.* qoruyucu; 2. şeytan *(tüfəngdə)*

**safety code** [ˈseɪftɪkoud] *n* texniki təhlükəsizlik qaydaları

**safety-glass** [ˈseɪftɪgla:s] *n* sınmayan şüşə; tripleks *(ikiqat şüşə)*

**safety nut** [ˈseɪftɪnʌt] *n tex.* kontrqayka *(tərs yivli qayka)*

**safety-razor** [ˈseɪftɪˌreɪzəʳ] *n* qorxusuz/təhlükəsiz ülgüc

**saffron** [ˈsæfrən] *n bot.* zəfəran

**sag**[1] [sæg] *n* 1. əyilmə, əyri, əyri yer; yatma, çökmə, qarın vermə *(divar haq.)*; **a deep ~ in the seat of the chair** stulun oturacağında dərin çökmə/yatma; 2. enmə, azalma, yatma; 3. *tic.* aşağı enmə

**sag**[2] [sæg] *v (-gg-)* 1. sallanmaq, əyilmək, çökmək; *The rope is sagging Kəndir sallanır*; *The beams have begun to sag Tirlər əyilməyə başlayıb*; *The seat of the chair sagged Stulun oturacağı çökdü/əyildi*; 2. oturmaq; *The door/The gate is sagging Qapı/Darvaza çökür/oturur*; 3. sallanmaq; *Her cheeks are sagging Onun yanaqları sallanır*; 4. zəifləmək; *My spirits sagged Mənim kefim pozuldu*; 5. *tic.* enmək, aşağı düşmək *(qiymət haq.)*; *Prices are sagging Qiymətlər aşağı düşür*; 6. *dən.* istiqaməti/səmti dəyişmək

**saga** [ˈsa:gə] *n* saqa, dastan; hekayət, rəvayət; **The Forsyte Saga** Forsaitlər saqası/dastanı

**saga-man** [ˈsa:gəmæn] *n (pl* **-men** [-mən]) saqa/dastan yazan, rəvayəti qələmə alan *(adam)*

**sage**[1] [ˈseɪdʒ] *n* I *bot.* sürvə, ada çayı

**sage** [ˈseɪdʒ] *n* II aqil; mütəfəkkir, filosof, müdrik adam; **the seven ~s of ancient Greece** Qədim Yunanıstanın yeddi mütəfəkkiri/filosofu

**sage**[2] [ˈseɪdʒ] *adj* aqil, müdrik, ağıllı; **a ~ priest/ruler /judge** müdrik keşiş/hökmdar/hakim

**sagebrush** [ˈseɪdʒbrʌʃ] *n bot.* yovşan

**sagely** [ˈseɪdʒlɪ] *adv* müdrikcəsinə, ağıllı, hakimanə; uzaqgörənliklə; fərasətlə

**said**[1] [sed] *adj* yuxarıda deyilmiş/xatırladılmış; **the ~ condition/sum of money** yuxarıda xatırladılmış şərt/pul məbləği

**said**[2] [sed] **to say** *felinin pt, pp formaları*

**saiga** [ˈsaɪgə] *n zool.* sayqak *(ceyranaoxşar heyvan)*

**sail**[1] [seɪl] *n* 1. yelkən; **to lower/to strike ~** yelkəni endirmək; **to hoist/to set ~** 1) yelkəni qaldırmaq/açmaq; 2) səyahətə çıxmaq/getmək *(yelkənli qayıqla/gəmi ilə)*; *We set sail tomorrow Biz sabah yola düşəcəyik (yelkənli gəmi ilə)*; 2. gəmi *(yelkənli)*; *There wasn't a sail in sight Heç bir gəmi görünmürdü*; 3. *top.i* yelkənli gəmilər; **a fleet of thirty ~s** otuz gəmidən ibarət flotiliya *(yelkənli)*;

◊ **under ~, with ~s set** yelkən altında; **to go full ~** bütün yelkənləri açaraq getmək/üzmək; **to shorten/to take in ~** 1) sürəti azaltmaq; 2) coşğunluğu azaltmaq; **to take the wind out of *smb.'s* ~s** bir kəsi çıxılmaz vəziyyətə salmaq

**sail**[2] [seɪl] *v* 1. üzmək *(yelkənli gəmidə)*; **to ~ slowly/at full speed** yavaş/tam sürətlə üzmək; **to ~ round the world** dünya səyahətinə çıxmaq *(yelkənli gəmi ilə)*; **to ~ on/over the sea** dənizdə üzmək; **to ~ the Pacific Ocean** Sakit okeanda üzmək; **to ~ along the coast/ southward** sahil boyu/şimala tərəf üzmək; **to ~ into harbour** limana daxil olmaq; 2. üzüb uzaqlaşmaq/ aralanmaq *(sahildən)*: *The boat sails at ten o'clock Gəmi saat onda gedir*; 3. süzmək *(havada)*, uçmaq; *An eagle was sailing through the blue sky Qartal mavi səmada süzürdü*; *The silvery moon sailed through the clouds Gümüşü ay buludların arasında süzdü*; 4. təkəbbürlə təşəxxüslə/təntənə ilə yerimək; *She sailed into the room O təkəbbürlə otağa daxil oldu*; 5. ida-

rə etmək *(gəmini, qayığı və s.)*; **to ~ a ship/a boat** gəmi/qayıq idarə etmək; *This boat sails well Bu qayıq asan idarə olunur*; **to ~ in** *d.d.* qətiyyətlə hərəkət etmək; **to ~ in and settle the dispute at once** qətiyyətlə qarışıb mübahisəni dərhal həll etmək;
◊ **to ~ into** *smb.* bir kəsin üstünə düşmək; **to ~ under false colours** özünün əsl məqsədini gizlətmək, ikiüzlülük/ riyakarlıq etmək

**sailboat** ['seɪlbout] *n* = **sailing-boat**

**sailcloth** ['seɪlklɔθ] *n* parusin *(qalın kətan parça)*

**sailing** ['seɪlɪŋ] *n* **1.** *dən.* üzmək; dəniz səfəri; **to be fond of ~** üzməyi/dənizi sevmək; **2.** gəmiçilik elmi, naviqasiya; **3.** yola düşmə, sahildən ayrılma; **time of ~** yola düşmə vaxtı; *Hours of sailing will be announced Yola düşmə vaxtı elan ediləcək (gəmi haq.)*

**sailing-boat** ['seɪlɪŋbout] *n* yelkənli qayıq

**sailing-master** ['seɪlɪŋ,ma:stə^r] *n* şturman *(gəmi və ya təyyarəni idarə edən şəxs)*

**sailing-ship** ['seɪlɪŋʃɪp] *n* yelkənli gəmi

**sailor** ['seɪlə^r] *n* dənizçi; **a ~ before the mast** sıravi dənizçi

**saint**[1] [seɪnt] *n* **1.** *din.* övliya, pir; **2.** ən əziz/qiymətli; **3.** müqəddəs *(adam)*; mələk; *He lived and died a saint O, mələk kimi yaşadı və mələk kimi öldü*; **4.** *din.* xristian, xaçpərəst;
◊ **to be with the Saints** müqəddəslərin yanına getmək, ölmək

**saint**[2] [seɪnt] *v* **1.** *din.* övliyalar sırasına keçirmək, müqəddəsləşdirmək; müqəddəs adlandırmaq; **2.** müqəddəs kimi yaşamaq və hərəkət etmək

**sainted** ['seɪntɪd] *adj* **1.** övliyalar sırasına keçirilmiş, müqəddəsləşdirilmiş; **2.** müqəddəs; **~ place** müqəddəs yer

**sainthood** ['seɪnthud] *n* **1.** müqəddəslik, qüdsiyət; **2.** *din.* övliyalıq; paklıq

**saintliness** ['seɪntlɪnɪs] *n* **1.** müqəddəslik, paklıq, günahsızlıq, saflıq, təmizlik, məsumluq; **2.** müqəddəs/ pak həyat

**saintly** ['seɪntlɪ] *adj* müqəddəs, pak; ədalətli, insaflı, mürvətli; günahsız, təmiz, məsum; **~ life** günahsız/təmiz həyat

**sake** [seɪk] *n* I xatir; **for the ~ of** *smb.*, **for** *smb.'s* **~** bir kəsin xatirinə; *Do it for my sake Bunu mənim xatirimə et/edin*; **for safety's ~** təhlükəsizlik xatirinə; **for the ~ of peace** sülh xatirinə; **for the ~ of our old friendship** köhnə dostluğumuzun xatirinə; **art for art's ~** incəsənət incəsənət xatirinə;
◊ *For God's/goodness' sake Allah xatirinə; For God's sake don't do it Allah xatirinə bunu etmə/etməyin*

**sake** [seɪk] *n* II düyü arağı

**salad** ['sæləd] *n* salat; **fish/meat ~** balıq/ət salatı; **vegetable ~** tərəvəz salatı; **dietetic ~** pəhriz salatı; **to make ~** salat düzəltmək; **to prepare ~** salat hazırlamaq; **to have ~ and cold meat for lunch** günorta salat və soyuq ət yemək

**salamander** ['sæləmændə^r] *n zool.* salamandr, səməndər *(həm suda, həm quruda yaşayan bəzi quyruqlu heyvanların adı)*

**salary** ['sælərɪ] *n* maaş, məvacib, aylıq, donluq; **monthly ~** aylıq maaş/məvacib; **yearly ~** illik maaş/məvacib

**sale**[1] [seɪl] *n* **1.** satış, satma, satılma; **goods on/for ~** satışda olan mal; **cash ~** nağd pula satılma; **~ on credit** kreditə verilmə, kreditlə satılma; *Is this car for sale? Bu maşın satılırmı? I've made no sale today Mən bu gün heç nə satmamışam; These books have a good sale Bu kitablar yaxşı satılır*; **2.** ticarət, ticarət sazişi/razılaşması, sövdə; alver; *No sale took place during the day Gün ərzində heç bir ticarət sazişi bağlanmadı; Sales are up/down this year Bu il alver yaxşıdır/pisdir*; **3.** auksion, hərrac *(açıq satış)*; **to put up for ~** auksiona /hərraca qoymaq, auksion/ hərrac vasitəsilə satmaq; **4.** *pl* ucuzlaşdırılmış qiymətə satmaq

**sale**[2] [seɪl] *adj* satış; **~ value/prices** satış dəyəri/qiymətləri; **~ goods** satış malları; **~ tax** satış vergisi

**saleable** ['seɪləbl] *adj* tezsatılan; satılmağa yarayan; **~ goods** tezsatılan mallar; *This house is not in saleable condition Bu ev satılmalı vəziyyətdə deyil; The houses are highly saleable now İndi evlər tez satılır*

**saleroom** ['seɪlru:m] *n* hərrac/auksion zalı

**salesman** ['seɪlzmən] *n (pl* **-men** [-mən]) satıcı; alverçi; *He is a born salesman O, anadangəlmə alverçidir*

**salesmanship** ['seɪlzmənʃɪp] *n* **1.** satıcılıq peşəsi/sənəti; **2.** satıcılıq/alverçilik bacarığı/qabiliyyəti

**salespeople** ['seɪlz,pi:pl] *n top.* i satıcılar, alverçilər

**sales-room** ['seɪlzru:m] *n* = **sale-room**

**saleswoman** ['seɪlz,wumən] *n (pl* **-women** [-,wumɪn]) satıcı qadın/qız

**salient** ['seɪlɪənt] *adj* **1.** qabağa/ irəli çıxan, dombalan; **~ eyes** dombalan gözlər; **2.** səciyyəvi, gözəçarpan; **the ~ points of a speech** nitqin səciyyəvi/ gözəçarpan cəhətləri; *He pointed out all the salient features of the new design O, təzə dizaynın bütün xüsusiyyətlərini qeyd etdi*

**salina** ['səlaɪnə] *n* duzlu göl

**saline**[1] ['seɪlaɪn] *n* **1.** *kim.* duz; **2.** şoranlıq, şorakət; **3.** duzlu göl

**saline**[2] ['seɪlaɪn] *adj* duz; duzlu, tərkibində duz olan; **a ~ lake** duzlu göl; **a ~ taste** duzlu dad; *The water has a saline taste Suda duz dadı var, Su duz dadır*

**salinity** [sə'lɪnətɪ, sə'lɪnɪtɪ] *n* **1.** duzluluq, şorluq; **2.** *k.t.* duzluluq, şorluluq, şoranlıq *(torpaq haq.)*

**salinizaion, -isation** [,sælɪnɪ'zeɪʃn] *n k.t.* şoranlaşma *(torpaq haq.)*

**saliva** [sə'laɪvə] *n* ağız suyu, tüpürcək, selik

**salivary** ['sælɪvərɪ] *adj* tüpürcək; **~ gland** tüpürcək vəzisi



**salivate** ['sælɪveɪt] *v* tüpürcək yaratmaq/ifraz etmək

**salivation** [,sælɪ'veɪʃn] *n* ağız suyu/tüpürcəyi buraxma, ağız sulanması

**sallow** ['sælou] *adj* solğun, xəstə; *She looked sallow O, xəstə görünürdü*

**sallowness** ['sælounɪs] *n* solğunluq, xəstə rəngi *(üz, dəri haq.)*

**sally**[1] ['sælɪ] *n* **1.** *hərb.* hücum, həmlə, basqın; **to make/to carry out a ~** hücum/həmlə etmək; **successful/sudden ~** müvəffəqiyyətli/qəfil hücum/həmlə; **2.** *pl* ağıllı və kinayəli fikir/rəy; həcv; **amusing/bitter sallies** gülməli/ acı atmacalar/replikalar; **brilliant ~** çox gözəl həcv; **3.** gəzinti, seyr, səyahət; **4.** münasibətsiz/yersiz hərəkət, ədəbsizlik; **a ~ of youth** gənclik hərəkəti

**sally**[2] ['sælɪ] *v (pt. pp* **sallied) 1.** *hərb.* hücum /həmlə/ basqın etmək; **2.** *d.d.* getmək, yollanmaq, yola düşmək *(bir yerə) (çox vaxt* **to ~ forth/out)**; *Let's sally forth and look at the town Gəl/Gəlin gedək şəhərdə gəzək/şəhəri seyr edək*; **to ~ out into the country** şəhərdən çıxıb kəndə gəzintiyə getmək; **to ~ out to hunt** ova getmək/ yollanmaq; *After dinner he sallied forth for a short walk Nahardan sonra o, qısamüddətli gəzintiyə çıxdı*

**salmon**[1] ['sæmən] *n (tək və cəm forması eynidir)* **1.** *zool.* qızılbalıq; **2.** qızılbalıq əti; **smoked ~** hisə verilib qurudulmuş qızılbalıq

**salmon**[2] ['sæmən] *adj* qızılbalıq, qızılbalıqdan hazırlanmış; **a ~ farm** qızılbalıq yetişdirmə təsərrüfatı; **a ~ salad** qızılbalıqdan hazırlanmış salat

**salmon family** ['sæmən,fæmɪlɪ] *n zool.* qızılbalıq fəsiləsi

**salon** ['sælɔn, sə'lɔn] *n* **1.** mehmanxana; saray zalı; **2.** salon, atelye; **beauty ~** gözəllik salonu; **3.** sərgi zalı; **4.** incəsənət əsərləri sərgisi

**saloon** [sə'lu:n] *n* **1.** meyxana, içkixana, bar; aşxana; **2.** zal; salon; **dancing/billiard ~** rəqs /bilyard zalı; **shaving ~** *amer.* kişi salonu *(dəlləkxana)*

**saloon-keeper** [sə'lu:n.ki:pə^r] *n* meyxana/içkixana/bar/ aşxana sahibi

**salt**[1] [sɔ:lt] *n* **1.** xörək duzu; **table ~** süfrə duzu; **in ~** duzlanmış; duza qoyulmuş; **meat/fish in ~** duzlanmış ət/balıq; **2.** fərasət, ağıllılıq, zirəklik; **a talk full of ~** ağıllı/duzlu söhbət; **3.** *kim.* duz; **~ of phosphorus** fosfor duzu; **4.** *əcz. pl* işlətmə duzu *(müalicə üçün işlədilən)*; **a dose of ~s** bir doza işlətmə duzu; **5.** *pl* çayın mənsəbinə daxil olan dəniz suyu;
◊ **to eat ~ with** *smb.* ≅ bir kəslə duz-çörək kəsmək; **to share** *smb.'s* **bread and ~** bir kəslə duz-çörək bölmək

**salt**[2] [sɔ:lt] *adj* **1.** duzlu; **~ butter** duzlu yağ; **~ water** duzlu su, dəniz suyu; **~ beef/pork** duzlu mal/donuz əti; *The food is too salt Yemək çox duzludur*; **2.** duz; **~ spring** duz yatağı/mənbəyi; **(the) ~ industries** duz sənayesi; **3.** ədəbsiz, nalayiq, yaramaz; **~ stories** ədəbsiz/nalayiq lətifələr; **~ jests** ədəbsiz/nalayiq zarafatlar; **4.** şoran; **~ pasture** şoran otlaqlar/örüşlər; **~ soil** şoran torpaq; **5.** şoranlıq; **~ plants** şoranlıq bitkiləri, şoranlıqda bitən/rast gələnən bitkilər

**salt**[3] [sɔ:lt] *v* **1.** duzlamaq, duz vurmaq/qatmaq; **to ~ butter** yağ duzlamaq; **2.** duza qoymaq *(həm də* **to ~ down)**; **to ~ down fish/meat** balığı/əti duza qoymaq; **to ~ vegetable** tərəfəzi duza qoymaq; *Have you salted the vegetable? Sən/Siz tərəvəzi duza qoymusanmı?/ qoymusunuzmu? They salted down most of the meat for their use later Sonralar istifadə etmək üçün onlar ətin əksər hissəsini duza qoydular/duzladılar*

**salt-cellar** ['sɔ:lt.selə^r] *n* duzqabı, nəməkdan

**salted** ['sɔ:ltɪd] *adj* **1.** duzlanmış, duz qatılmış/vurulmuş; **~ beef/pork** duzlanmış mal/donuz əti; **~ vegetables** duzlanmış tərəvəzlər; **2.** *d.d.* təcrübəli

**salter** ['sɔ:ltə^r] *n* **1.** duzsatan; **2.** duzçu, duz istehsalı işçisi; **3.** duzlayan, duzlayıcı *(fəhlə)*

**saltiness** ['sɔ:ltɪnɪs] *n* **1.** duzluluq; **2.** duz dadı

**salting** ['sɔ:ltɪŋ] *n* **1.** duzlama, duza qoyma; **2.** *adət pl* şoran, şorakət, şoranlıq

**saltish** ['sɔ:ltɪʃ] *adj* şor, şortəhər, duzlutəhər

**salt rock** ['sɔ:ltrɔk] *n* daşduz

**saltshaker** ['sɔ:lt.ʃeɪkə^r] *n* deşikli duzqabı/nəməkdan

**salt-spoon** ['sɔ:ltspu:n] *n* duz qaşığı

**salty** ['sɔ:ltɪ] *adj* **(-ier, -iest) 1.** duzlu; **~ butter** duzlu yağ; **2.** dəniz, dəniz iyi gələn; **3.** ədəbsiz, nalayiq, yaramaz; **~ talk among men** kişilər arasında ədəbsiz/nalayiq söhbət

**salutary** ['sæljutrɪ] *adj* **1.** sağlam, şəfaverici, cana xeyirli; **2.** faydalı, xeyirli, yararlı, sərfəli; **a ~ lesson** faydalı/ xeyirli dərs; **~ effect** faydalı/xeyirli təsir; **~ warming** xeyirli/faydalı xəbərdarlıq

**salutation** ['sælju'teɪʃn] *n* salam, salamlama, təbrik, təbrik etmə; **a word of ~** təbrik sözü; **hearty ~** ürəkdən salamlama/təbrik etmə; **to take off/to raise** *one's* **hat in ~** salam əlaməti olaraq papağını çıxartmaq/qaldırmaq

**salute**[1] [sə'lu:t] *n* **1.** dostcasına salamlaşma; **parting ~** vidalaşma salamı; **to give a ~ to** *smb.* bir kəsə salam vermək, bir kəslə salamlaşmaq; **to return a ~** salama cavab vermək; **2.** *hərb.* salamlaşma, rəsmi təzim etmə; **to take the ~** hərbi salama cavab vermək; **to stand at (the) ~** rəsmi təzim etmək üçün farağat dayanmaq; **to render a ~** rəsmi təzim etmək; *The officer returned the soldiers' salute Zabit əsgərlərin salamına cavab verdi*; **3.** salyut, yaylım atəşi *(atəş açmaq, fişəng atmaq, bayraq qaldırıb-endirmək və s.)*; **to fire a ~** yaylım atəşi açmaq

**salute**[2] [sə'lu:t] *v* **1.** salamlaşmaq, salam vermək;

to ~ **courteously/ respectfully/ cordially** ədəblə/hörmətlə/ ürəkdən salamlaşmaq; **to ~ *smb.* with a smile** bir kəsi təbəssümlə salamlamaq; **to ~ *smb.* with a kiss** bir kəsi öpərək salamlamaq; *They saluted each other with a frigid bow Onlar bir-birinə soyuqcasına təzim etdilər*; 2. *hərb.* rəsmi salam vermək; **to ~ with the sword** qılıncla salamlaşmaq/salam vermək; **to ~ *one's* superior officers** rütbəcə özündən yuxarı olan zabitlərə rəsmi salam vermək; 3. yaylım atəşi açmaq; **to ~ with twenty guns** iyirmi topdan yaylım atəşi açmaq; 4. qarşılamaq; qəbul etmək *(bir kəsi)*; **to ~ *smb.* with a smile /with cordiality** bir kəsi təbəssümlə /ürəkdən qəbul etmək

**salvage**[1] ['sælvɪdʒ] *n* 1. əmlakı xilas etmə *(yanğından)*, gəmini və ya yükü xilas etmə *(dənizdə)*; **the ~ of a ship's cargo** gəminin yükünü xilas etmə; 2. batmış gəmini qaldırma; 3. *hərb.* qənimət; 4. xilas etmə xərcləri; əmlakı xilas etməyə görə mükafat *(adət. gəmi və ya onun yükünü)*; 5. sənaye qırıntıları və tullantıları, skrap *(təkrar əridilmiş metal qalıqları)*; util *(istifadəyə yararsız tullantılar)*

**salvage**[2] ['sælvɪdʒ] *adj* xilasedici; xilas edən; **a ~ ship** xilasedici gəmi; **~ appliance** xilasedici vasitə; **a ~ company** xilasedici cəmiyyət; **~ money** əmlakı xilas etməyə görə pul/mükafat

**salvage**[3] ['sælvɪdʒ] *v* 1. xilas etmək *(əmlakı, gəmini və s. yanğından)*; **to ~ a family** ailəni xilas etmək, kəbinin pozulmasına imkan verməmək; 2. *hərb.* dava meydanında qənimət toplamaq; 3. sənaye qırıntılarından /tullantılarından/utildən istifadə etmək

**salvaging** ['sælvɪdʒɪŋ] *n* 1. istifadə, istifadə etmə /edilmə, işlətmə, tullantılardan istifadə etmə; 2. qənimətdən və bərpa edilmiş əmlakdan istifadə etmə; 3. *dən.* xilasetmə işləri

**salvation** [sæl'veɪʃn] *n* 1. xilas etmə/olma, qurtarma, qurtuluş, nicat; *The salvation of his country was his only aim Vətənini xilas etmək onun yeganə məqsədi idi; His salvation depends on quick action Onun xilası təxirsiz hərəkətlərdən asılıdır*; 2. *din.* əbədi səadət/xoşbəxtlik; **to find ~** xilas olmaq, ruhən azad olmaq, rahatlıq tapmaq; 3. **(the ~)** xilaskar; *You have been the salvation of me Sən/Siz mənim xilaskarımsan/xilaskarımsınız; He was the salvation of his country O, vətəninin xilaskarı idi*

**Salvation Army** [sæl'veɪʃn'a:mɪ] *n* Xilaskar Ordu *(üzvləri xüsusi forma geyinən və xüsusən kasıblara kömək edən/göstərən xristian təşkilatı)*

**salvationist** [sæl'veɪʃənɪst] *n* Xilaskar Ordunun üzvü (bax: **Salvation Army**)

**salve**[1] [sælv, sa:v] *n* maz, məlhəm

**salve**[2] [sælv, sa:v] *v* 1. sakitləşdirmək, yumşaltmaq *(ağrını və s.)*; **to do *smth.* to ~ *one's* conscience** vicdanını sakitləşdirmək üçün bir şey etmək; **to ~ difficulties/ discrepancies** çətinlikləri/narazılıqları yumşaltmaq/ azaltmaq/aradan qaldırmaq; 2. *şair.* məlhəm qoymaq, sağaltmaq; **to put ~ on wounds** yaralara məlhəm qoymaq, yaraları sağaltmaq; 3. *amer. d.d.* yarınmaq, yaltaqlıq etmək; dilə tutmaq

**salver** ['sælvə^r] *n* podnos, məcməyi, sini *(qiymətli metaldan qayrılmış: məktub, içki və s. üçün)*; **a silver/gold ~** gümüş/qızıl podnos

**salvia** ['sælvɪə] *n bot.* sürvə, adaçayı *(bitki və ya bu bitkidən hazırlanmış maye dərman)*

**salvo**[1] ['sælvou] *n (pl -os və ya -oes)* 1. atəş, yaylım atəşi *(toplardan atılan)*; **a ~ of twenty-one guns** iyirmi bir topdan atılan yaylım atəşi; **a ~ from the ship's guns ~** gəminin bütün toplarından atılan salam atəşi; 2. *hərb.* qatar *(pulemyotdan, avtomatdan buraxılan güllə qatarı)*; 3. gurultu *(alqış və s. haq.)*; **a ~ of applause** alqış gurultusu

**salvo**[2] ['sælvou] *v* salamlamaq üçün yaylım atəşi açmaq

**samba** ['sæmbə] *n* samba *(Braziliya rəqsi)*; samba rəqsi üçün musiqi

**sambo** ['sæmbou] *n* I *id.* sambo

**sambo** ['sæmbou] *n* II sambo *(hindu ilə zəncilərdən törəmiş nəsil)*

**same** [seɪm] *pron (adət.* **the ~**) eyni, həmin; **the ~ night** həmin gecə; **at the ~ time** eyni/həmin vaxtda/eyni zamanda; **to settle several matters at the ~ time** bir neçə məsələni eyni vaxtda həll etmək; **to belong one and the ~ class** eyni sinfə aid/daxil olmaq; **to put *smth.* back in the ~ place** bir şeyi qaytarıb həmin yerinə qoymaq; *He is no longer the same man O artıq həmin adam deyil; She was always the same little girl to me O mənim üçün həmişə eyni balaca qız olaraq qalırdı*; **on the ~ ground** eyni əsasda; *That is the same song I heard yesterday Bu mənim dünən eşitdiyim həmin mahnıdır*; **to hold the ~ opinion as the majority** əksəriyyətlə eyni fikirdə olmaq; **to give the ~ answer as before** əvvəlki kimi (eyni) cavab vermək; *Sailors received the same pay as soldiers Dənizçilər əsgərlərlə eyni məvacib aldılar*; **on the ~ day every year** hər il eyni gündə; **at the ~ price** eyni qiymətə

**sameliness** ['seɪmlɪnɪs] *n* eynilik, bircürəlik, yekrənglik, yeknəsəqlik

**samely** ['seɪmlɪ] *adj* bir cür, yekrəng, yeknəsəq; monoton, bir tonlu

**sameness** ['seɪmnɪs] *n* 1. eynilik, oxşayış, bənzəyiş, oxşarlıq, bənzərlik; **~ of character** xarakterin oxşarlığı/ bənzəyişi/bənzərliyi; **~ of shape** formanın eyniliyi/ oxşarlığı; **~ of views** baxışların eyniliyi; **~ in taste** zövqdə oxşarlıq/bənzərlik/bənzəyiş; **~ and otherness** *dilç.* eynilik və fərq; 2. bircürəlik, yekrənglik, yeknəsəqlik; **a deadly ~ in life** həyatda cansıxıcı/ müdhiş yeknəsəqlik



**sample**[1] ['sa:mpl] *n* 1. nümunə, örnək; **fine ~** gözəl nümunə; **a book of ~s** nümunələr albomu; **to sell by ~** nümunəyə əsasən satmaq; **up to ~** nümunəyə müvafiq; **a ~ of courage** cəsarət/cürət/igidlik/qoçaqlıq nümunəsi; 2. şablon, basmaqəlib, model

**sample**[2] ['sa:mpl] *adj* nümunəvi, nümunə; **~ tea/wool/silk** çay/yun/ipək nümunəsi; **~ copy** *poliqr.* nümunə, nüsxə, siqnal nümunəsi

**sample**[3] ['sa:mpl] *v* 1. nümunə götürmək; 2. sınamaq, yoxlamaq, təcrübə etmək

**sampler** ['sa:mplə^r] *n* 1. nümunə, şablon; 2. tikmənin naxışı

**sample-room** ['sa:mplrum] *n* nümayiş etdirmə zalı/otağı

**sanatoria** [.sænə'tɔ:rɪə] *n* **sanatorium** *isminin cəm forması*

**sanatorium** [.sænə'tɔ:rɪəm] *n* 1. sanatoriya; **tuberculosis ~** vərəm sanatoriyası; 2. kurort *(təbii müalicə vasitələri olan yer)*, dağ kurortu

**sanctification** [.sæŋktɪfɪ'keɪʃn] *n* 1. işıqlandırma, aydınlaşdırma, izah/tanış etmə; 2. *din.* kilsə tərəfindən övliyalar sırasına keçirilmə/keçirmə

**sanctify** ['sæŋktɪfaɪ] *v (pt, pp* **-fied**) 1. əziz tutmaq, müqəddəs sanmaq/saymaq; müqəddəsləşdirmək; 2. günahlardan təmizləmək; 3. *din.* himayə etmək, qorumaq; 4. təmizə çıxartmaq, bəraət/haqq qazandırmaq; 5. ödəmək

**sanctimonious** [.sæŋktɪ'mounɪəs] *adj* riyakar, ikiüzlü, riyakarcasına; **a ~ smile** riyakar/riyakarcasına təbəssüm; **a ~ newspaper editorial** riyakarcasına yazılmış baş məqalə *(qəzetdə)*

**sanctimoniously** [.sæŋktɪ'mounɪəslɪ] *adv* riyakarcasına, ikiüzlü; **to speak ~** riyakarcasına/ ikiüzlü danışmaq

**sanctimoniousness** [.sæŋktɪ'mounɪəsnɪs] *n* riyakarlıq, ikiüzlülük

**sanction**[1] ['sæŋkʃn] *n* 1. icazə, təsdiq etmə; **official ~** rəsmi icazə; **to give/to grant ~ to *smth.*** bir şeyə icazə vermək, bir şeyi təsdiq etmək; *This book was translated with the sanction of its author into English Bu kitab ingilis dilinə onun müəllifinin icazəsi ilə tərcümə edildi*; **to obtain the ~ of the proper authorities** müvafiq yuxarı orqanlardan icazə almaq; 2. razılıq; **to give an official ~** rəsmi razılıq vermək; **to get the ~ of *smb.*** bir kəsin razılığını almaq; **without/with *smb.'s* ~** bir kəsin razılığı olmadan/razılığı ilə; *The Parliament gave its sanction to the change of policy Parlament siyasəti dəyişdirməyə razılıq verdi*; 3. bəyənmə, tərəfdar olma, müdafiə etmə; **tacit ~** dinməz bəyənmə; 4. fikir, mülahizə; dəlil, sübut, səbəb; **religious ~** dini fikir/ mülahizə; **philosophical ~s** fəlsəfi fikirlər/ mülahizələr; 5. *əsas. pl* sanksiya *(beynəlxalq hüquqda: öz təəhhüd və müqavilələrini pozan və ya digər şərtlərə əməl etməyən dövlətə qarşı görülən tədbir)*; **financial/ economic/ military ~s** maliyyə/iqtisadi/hərbi sanksiyalar; **to apply ~s against *smb.*** bir kəsə qarşı sanksiya tətbiq etmək; **punitive ~s** cəzalandırıcı sanksiyalar; 6. *hüq.* qanunun nəzərdə tutduğu cəza növü; **the last ~s of the law** ölüm cəzası

**sanction**[2] ['sæŋkʃn] *v* 1. icazə vermək; təsdiq etmək; *The church would not sanction the king's second marriage Kilsə kralın ikinci izdivacına icazə verməz*; 2. bəyənmək, yol vermək; *His conscience doesn't sanction it Onun vicdanı buna yol vermir*; 3. *hüq.* cəza nəzərdə tutmaq *(qanunda)*

**sanctity** ['sæŋktɪtɪ] *n* 1. müqəddəslik, qüdsiyyət; övliyalıq; paklıq; günahsızlıq, məsumluq; **angelic ~** mələk paklığı/məsumluğu; **the ~ of *smb.'s* life** bir kəsin həyatının paklığı; 2. toxunulmazlıq, müqəddəslik; **the ~ of an oath/of a treaty** andın/müqavilənin müqəddəsliyi; **the ~ of the home** ailə müqəddəsliyi/toxunulmazlığı; **to uphold the ~ of the marriage ties** nikah bağlarını müqəddəs tutmaq; 3. müqəddəs vəzifə/borc

**sanctuary** ['sæŋktʃuərɪ] *n* 1. müqəddəs yer *(məs. məscid, kilsə və s.)*; 2. məbəd; **the ~ of sciences** elmlərin məbədi; 3. sığınacaq, daldalanacaq *(yer)*, pənahgah; **inviolable ~** etibarlı/mötəbər/möhkəm sığınacaq; **to seek ~** sığınacaq axtarmaq; **to find ~ in sleep** yuxuda rahatlıq tapmaq; 4. gizli/xəlvət yer, xəlvətxana; 5. qoruq, qoruq yeri; **bird ~** quş qoruğu; 6. ovun qadağan/yasaq olunduğu mövsüm

**sanctum** ['sæŋktəm] *n (pl həm də* **-ta**) 1. məbəd, ibadətgah; müqəddəs yer; 2. iş kabineti

**sand**[1] ['sænd] *n* 1. qum; **fine/coarse ~** narın/iri qum; **sea ~** dəniz qumu; 2. *adət pl* qumlu çimərlik; dayaz yer; **to play on the ~s** çimərlikdə/qumluqda oynamaq; 3. *pl* qumluq, qumluq səhra; **unending/pathless ~s** ucsuz-bucaqsız/cığırsız qumluq səhra; 4. qum *(saatda)*; 5. *pl məc.* həyatın günləri; *The sands are running out Ömür/ Həyat qurtarır, Zaman sona çatır*; 6. nəm çəkmiş qənd/ şəkər;

◊ **to put/to throw ~ in the wheels** işə mane olmaq/ əngəl törətmək

**sand**[2] ['sænd] *v* 1. qum tökmək; **to ~ a road/a street** yola/küçəyə qum tökmək; 2. qum basmaq; 3. quma basdırmaq; 4. qumla təmizləmək/cilalamaq; 5. qum qatmaq, qumla qarışdırmaq; **to ~ the sugar** qəndə şəkər tozu qatmaq

**sandal** ['sændl] *n* 1. səndəl *(ayaqqabı)*; tufli; **dancing/bathing ~s** balet/çimərlik səndəli; 2. qayış *(səndəl üçün)*

**sandal** ['sændl] *n* II = **sandalwood**

**sandalwood**[1] ['sændlwud] *n* 1. *bot.* səndəl ağacı; 2. səndəl ağacının oduncağı

**sandalwood**[2] ['sændlwud] *adj* səndəl; **~ oil** səndəl yağı, səndəl ağacından alınmış yağ; **~ soap** səndəl sabunu

**sandbag**[1] ['sændbæg] *n* qumla doldurulmuş kisə

**sandbag²** ['sændbæg] *v* (-gg-) qum doldurulmuş kisə ilə müdafiə etmək; *Sandbag the doorway to keep the water out Suyun qabağını kəsmək üçün qapının ağzına qumla doldurulmuş kisə qoy/qoyun*

**sandbank** ['sændbæŋk] *n* qumlu dayaz yer/çay, banka *(dənizin dibindəki hündürlüklər)*

**sandbath** ['sændba:θ] *n tib.* qum vannası

**sandbox** ['sændbɔks] *n amer.* = **sandpit**

**sandcastle** ['sændka:sl] *n* qum qəsri *(uşaqların qumdan düzəltdiyi evcik: adət. çimərlikdə)*

**sanded** ['sændɪd] *adj* **1.** qum tökülmüş; **2.** qum qarışdırılmış; **3.** sumbata ilə cilalanmış

**sandglass** ['sændgla:s] *n* qum saatı

**sandpaper¹** ['sændpeɪpəʳ] *n* sumbata

**sandpaper²** ['sændpeɪpəʳ] *v* sumbata ilə təmizləmək/ cilalamaq

**sandpit** ['sændpɪt] *n* **1.** qum karxanası; **2.** *id.* qum çuxuru *(hoppanmaq üçün)*

**sandstone** ['sændstoun] *n* qumdaşı, qumdan əmələ gəlmiş daş

**sandstorm** ['sændstɔ:m] *n* qum tufanı/fırtınası

**sandwich¹** ['sændwɪdʒ] *n* sandviç; **ham/chicken/cheese,** *etc.* ~ donuz əti/çolpa/pendir və s. sandviçi

**sandwich²** ['sændwɪdʒ] *v* sandviç düzəltmək

**sandy** ['sændɪ] *adj* **1.** qumlu; ~ **soil** qumlu torpaq; **2.** *məc.* davamsız, tezdağılan; ~ **foundation** davamsız özül/ bünövrə; **3.** kürən, sarı, sarı-qırmızı; ~ **hair** kürən/sarı saç

**sane** [seɪn] *adj* (-r, -st) **1.** normal, ruhi baxımdan sağlam, ağlı başında; **a ~ man** normal/ağlı başında adam; **2.** ağıllı; **a ~ person/decision/policy** ağıllı adam/qərar/ siyasət

**sanely** ['seɪnlɪ] *adv* sağlam, sağlam nəzərlə, normal olaraq, ağıl ilə, ağıllı, düşünərək, məntiqlə

**sang** [sæŋ] **to sing** *felinin pt forması*

**sanguinary** ['sæŋgwɪnərɪ] *adj* **1.** qanlı; **a ~ battle** qanlı döyüş/vuruş; **2.** qana batmış/ bulanmış; ~ **hands** qana batmış əllər; **3.** qaniçən, zalım, müstəbid; **a ~ tyrant** qaniçən/ zalım/müstəbid hökmdar; **4.** lənətə gəlmiş, lənətlənmiş, mənhus

**sanguine** ['sæŋgwɪn] *adj* **1.** şən, nəşəli, gülərüzlü; **a ~ person** şən/nəşəli/gülərüzlü adam; ~ **temperament** coşğun/şən temperament; **2.** optimist; ümidlə dolu; sevindirici; ~ **hopes** sevindirici ümidlər; ~ **reports** optimist məlumatlar; **to be ~ of success** müvəffəqiyyətə əmin olmaq; **3.** qırmızı, al; ~ **face** qırmızı sifət; ~ **lips** qırmızı dodaqlar; ~ **cheeks** al yanaqlar; **4.** *şair.* qana batmış/bulanmış; qanlı

**sanitary** ['sænɪtrɪ] *adj* sanitar; ~ **science** sanitariya; gigiyena; ~ **enlightenment** sanitar/gigiyena maarifi; ~ **engineering** sanitariya texnikası; ~ **laws** sanitariya qanunları; ~ **belt** sanitar kəmər; **to render ~** gigiyenik şərait yaratmaq; ~ **service** sanitar xidməti

**sanitation** [,sænɪ'teɪʃn] *n* **1.** sağlamlaşdırma; yaxşılaşdırma; **2.** sanitar vəziyyəti yaxşılaşdırma; **3.** sanitariya; sanitar profilaktika *(xəstəliyin qarşısını alma tədbirləri)*; **4.** su kəməri və kanalizasiya

**sanitize, -ise** ['sænɪtaɪz] *v* **1.** sanitar şəraiti yaratmaq /yaxşılaşdırmaq; **2.** sağlamlaşdırmaq, yaxşılaşdırmaq, qaydaya salmaq; **3.** sanitariya qovşağı düzəltmək/ hazırlamaq

**sanity** ['sænətɪ] *n* **1.** sağlam şüur, ağıl; **to lose one's ~** ağlını/şüurunu itirmək; **2.** ağıllılıq, şüurluluq, məntiqlilik, kamal; ~ **of thought/of judgement/of outlook** hökmün/ mühakimənin / əqidənin məntiqliliyi

**sank** [sæŋk] **to sink** *felinin pt forması*

**Sanskrit¹** ['sænskrɪt] *n dilç.* sanskrit

**Sanskrit²** ['sænskrɪt] *adj* sanskrit, sanskritə aid; **the ~ language** sanskrit dili

**sap¹** [sæp] *n* I **1.** şirə, su *(bitkilərdə)*; ~ **of fruit** meyvə şirəsi; ~ **of lemon** limon şirəsi/suyu; **2.** *məc.* həyatverici/canlandırıcı qüvvə, güc, enerji; **the ~ of youth** gəncliyin gücü/enerjisi; **to lack ~** yaşamağa qabil olmamaq, gücsüz olmaq

**sap** [sæp] *n* II *hərb.* səngər, xəndək; **underground ~** yeraltı səngər

**sap** [sæp] *n* III axmaq, sarsaq, maymaq, fərsiz, ağzıaçıq *(adam)*

**sap** [sæp] *n* IV *jarq.* **1.** əzbərçi; **2.** əzbərçilik, əzbərləmə; **3.** yorucu/yeknəsəq/darıxdırıcı/ cansıxıcı iş; *It is such a sap. It is too much sap Bu çox yeknəsəqdir/darıxdırıcıdır*

**sap²** [sæp] *v* (-pp-) I **1.** qurutmaq, qupquru etmək; **2.** üzmək, əldən/taqətdən salmaq; arıqlatmaq, zəiflətmək; tükətmək, korlamaq; **to ~ smb.'s health** bir kəsin səhhətini korlamaq; **to ~ smb.'s strength** bir kəsin gücünü/enerjisini tükətmək; **to ~ the adversary's stamina** *id.* rəqibi əldən/gücdən salmaq, rəqibi zəifləmək

**sap** [sæp] *v* (-pp-) II **1.** *hərb.* səngər qazmaq, xəndək qazmaq/çökmək, altını oymaq; *Walls are sapped by the water Su divarların altını oyub*; **2.** irəli getmək, irəliləmək *(gizlicə)*; **to ~ one's way** gizlicə irəli getmək/yolunu davam etdirmək

**sap** [sæp] *v* (-pp-) III *jarq.* əzbərləmək, əzbər öyrənmək

**sapience** ['seɪpjəns] *n* müdriklik, fəzilət, aqillik, ağıllılıq

**sapient** ['seɪpɪənt] *adj* ağıllı, müdrik; bilən

**sapiently** ['seɪpjəntlɪ] *adv* müdrikcəsinə, ağıllı, həkimanə; **to speak ~** müdrikcəsinə/ağıllı danışmaq

**sapless** ['sæplɪs] *adj* **1.** quru, qurumuş; şirəsiz; **2.** çox arıq/zəif; **a ~ old lady** çox zəif qoca xanım; **3.** mənasız, məzmunsuz; bayağı; ~ **anecdotes** bayağı lətifələr

**sapling** ['sæplɪŋ] *n* **1.** zoğ, cavan budaq/ağac; şitil, qələm *(bitkidən qoparılaraq ayrıca əkilən gövdə)*; **2.** uşaq, körpə, cavan oğlan; **3.** tazının /ov itinin küçüyü *(bir ilə qədər)*



**sapphire¹** ['sæfaɪəʳ] *n* göy yaqut, sapfir

**sapphire²** ['sæfaɪəʳ] *adj* tünd mavi/göy, yaqut rənginə oxşar/bənzər; ~ **sea** mavi dəniz

**sappiness** ['sæpɪnɪs] *n* I **1.** şirəlilik, suluiuq *(bitki haq.)*; **2.** ləzzətlilik, dadlılıq; **3.** güc, enerji; həyat qabiliyyəti

**sappiness** ['sæpɪnɪs] *n* II *d.d.* sarsaqlıq, giclik, səfehlik, axmaqlıq, ağılsızlıq

**sappy¹** ['sæpɪ] *n d.d.* sarsaq, səfeh, ağılsız, gic *(adam)*

**sappy²** ['sæpɪ] *adj* **1.** şirəli, sulu *(bitki haq.)*; **2.** gənc, enerjili, zirək, diribaş, çevik, qıvraq; **3.** ağzıboş, iradəsiz, zəif xasiyyətli

**sarcasm** ['sa:kæzm] *n* sarkazm, acı istehza/gülüş, kinayə; **cutting/crushing ~** dağıdıcı istehza; **deadly ~** öldürücü kinayə/sarkazm; **bitter ~** acı istehza

**sarcastic** [sa:'kæstɪk] *adj* istehzalı, kinayəli, acı, zərərli, rişxəndli, tikanlı; ~ **smile** istehzalı/kinayəli təbəssüm; ~ **remark** tikanlı irad; **to speak with a ~ air** istehzalı/kinayəli tonda /tərzdə danışmaq

**sarcastical** [sa:'kæstɪkl] *adj* = **sarcastic**

**sarcastically** [sa:'kæstɪkəlɪ] *adv* istehzalı, istehza ilə, kinayəli, kinayə ilə, acı-acı, tikanlı-tikanlı

**sarcophagus** [sa:'kɔfəgəs] *n* sarkofaq *(sərdabə, məqbərə)*

**sardine** [sa:'di:n] *n zool.* sardina *(siyənək fəsiləsindən olan xırda balıq)*

**sardonic** [sa:'dɔnɪk] *adj* hirsli, acıqlı, qəzəbli, kinli; istehzalı; ~ **smile** istehzalı təbəssüm; ~ **laugh** hirsli/ istehzalı gülüş

**sardonical** [sa:'dɔnɪkl] *adj* = **sardonic**

**sardonically** [sa:'dɔnɪklɪ] *adv* acı-acı, kinayəli, kinayəli bir tərzdə/surətdə; hirslə, kinli-kinli

**sarrasin** ['særəsɪn] *n bot.* qarabaşaq

**sash** [sæʃ] *n* I toqqa, qayış, kəmər, qursaq, belbağı

**sash** [sæʃ] *n* II pəncərə çərçivəsi; **fixed/folding ~** açılmayan/qatlanan pəncərə çərçivəsi; **inner ~** daxili çərçivə

**sashay** ['sæʃeɪ] *v* **1.** *amer. d.d.* yollanmaq, yola düşmək; **to ~ to the library** kitabxanaya yollanmaq; **2.** yüngül/sərbəst yerişlə getmək/yerimək, nazlana-nazlana yerimək

**sassage** ['sæsɪdʒ] *n* kolbasa

**sat** [sæt] **to sit** *felinin pt forması*

**Satan** ['seɪtn] *n* şeytan, iblis

**satanic** [sə'tænɪk] *adj* şeytan, iblis; şeytani, iblisanə; ~ **influence** şeytani təsir

**satanical** [sə'tænɪkl] *adj* = **satanic**

**Satanism** ['seɪtənɪzəm] *n* satanizm *(iblisə sitayiş, şeytanpərəstlik)*

**sateen** [sæ'ti:n] *n toxuc.* sətin

**satellite** ['sætəlaɪt] *n* **1.** *astr.* peyk; **Earth ~** Yerin peyki; *The moon is the Earth's satellite Ay Yerin peykidir*; **natural ~** təbii peyk; **2.** süni peyk; **to shoot up/to launch a ~** süni peyk buraxmaq; **3.** müşayiətçi, müşayiət edən; svitanın üzvü, təntənəli mərasimin iştirakçısı

**satiable** ['seɪʃjəbl] *adj* təmin edən

**satiate** ['seɪʃɪeɪt] *v (adət. məchulda işlənir)* doydurmaq, doyuzdurmaq; razı salmaq/etmək; **to ~smb.'s desire/ smb.'s lust for power** bir kəsin arzusunu/ hakimiyyət ehtirasını təmin etmək; **to ~ smb.'s appetite** bir kəsi doyuzdurmaq

**satiation** [,seɪʃɪ'eɪʃn] *n* **1.** doyma, doydurma; **2.** məmnunluq, məmnun olma, razı olma/qalma

**satiety** [sə'taɪətɪ] *n* doyma, doydurma; **to eat and drink to ~** doyunca yemək və içmək; ~ **of life itself** həyatdan doyma

**satin¹** ['sætɪn] *n toxuc.* atlas

**satin²** ['sætɪn] *adj* atlas; **a ~ ribbon** atlas lent; **a white ~ dress** ağ atlasdan tikilmiş paltar

**satiny** ['sætɪnɪ] *adj* atlas, atlas/ipək kimi; ~ **skin** atlas/ipək kimi dəri

**satire** ['sætaɪə] *n* **1.** satira, kinayə; **biting/better ~** iti/acı satira; **a master of political ~** siyasi satira ustası; **2.** satirik əsər

**satiric** [sə'tɪrɪk] *adj* satirik, satira; **a ~ poem/verse** satirik poema/şer; ~ **style** satirik üslub

**satirical** [sə'tɪrɪkl] *adj* **1.** = **satiric**; **2.** acı, zəhərli; istehzalı;~ **look** istehzalı baxış; ~ **laughter** istehzalı/acı gülüş

**satirically** [sə'tɪrɪkəlɪ] *adv* istehzalı, istehza/masqara ilə, ələ salaraq

**satirist** ['sætərɪst] *n* satirik, satira/həcv yazan

**satirize, -ise** ['sætəraɪz] *v* lağa/masqaraya qoymaq, istehza/ rişxənd etmək, ələ salmaq

**satisfaction** [,sætɪs'fækʃn] *n* **1.** məmnuniyyət, məmnunluq, razılıq, razı olma/qalma; **complete/partial/inner ~** tam/yarımçıq /daxili məmnunluq; **a feeling of ~** razılıq/məmnunluq hissi; **with ~** məmnunluqla, məmnuniyyətlə; **to have the ~ of *smth.*** bir şeydən razı qalmaq/olmaq; **to give ~** məmnunluq vermək; **2.** ləzzət, həzz; **to take a special ~ in *smth.*** bir şeydən xüsusi ləzzət/həzz almaq; **3.** duelə çağırma; **to demand ~** duelə çağırmaq; **to give ~ 1)** duelə cavab vermək, dueli qəbul etmək; **2)** üzr istəmək; **4.** *hüq.* öhdəliyi/təəhhüdü yerinə yetirmək; ~ **of debt** borcu ödəmə/vermə/qaytarma; **to make ~** zərəri/ziyanı/itkini ödəmək; **to enter ~** əvəzini vermək, ödəmək; **5.** *din.* günahı təmizləmə/yuma; dini cəza; **to make ~ for sins** günahlarını yumaq/təmizləmək

**satisfactorily** [,sætɪs'fæktərɪlɪ] *adv* kifayət qədər/ dərəcədə, qənaətbəxş; *This incident has never been satisfactorily explained Bu hadisə heç vaxt kifayət qədər izah edilməyib*

**satisfactoriness** [,sætɪs'fæktərɪnɪs] *n* kafilik, kifayətləndiricilik, qənaətləndiricilik, qənaətbəxşlik

**satisfactory** [,sætɪs'fæktərɪ] *adj* **1.** kafi, kifayətləndirici, qənaətbəxş, qənaətləndirici; **a ~ explanation** kifayətləndirici/qənaətbəxş izahat; **a ~ result** qənaətləndirici/ kafi nəticə; *The result of the experiment was satisfactory Ekspe-*

*rimentin nəticəsi qənaətləndirici idi*; **to be ~ to smb.** bir kəsi qənaətləndirmək; 2. uğurlu, yaxşı, xoş, xoşagedən, gözəl; **~ marriage** uğurlu nikah/izdivac; **a ~ horse to ride** minmək üçün yaxşı at; *It's satisfactory to hear of his success Onun uğuru haqqında eşitmək xoşdur*; 3. *din.* yuyan *(günahı)*

**satisfied** ['sætɪsfaɪd] *adj* 1. razı qalmış/salınmış; razı, məmnun, xoşnud; **thousands of ~ customers** minlərlə razı salınmış müştəri; **a ~ smile** xoşnud təbəssüm; *I feel quite satisfied with my day's work Mən gündəlik işimdən tamamilə məmnunam/razıyam*

**satisfy** ['sætɪsfaɪ] *v* 1. razı salmaq, razı/təmin etmək; razı olmaq; **to be satisfied with *smth.*** bir şeydən razı qalmaq/olmaq; **to rest satisfied** razı olmaq/qalmaq; *Nothing satisfies him Onu heç nə razı salmır*; 2. təmin /qane etmək, yerinə yetirmək; **to ~ *smb.*'s wants** bir kəsin tələblərini təmin etmək/yerinə yetirmək; *Mere words don't satisfy me Boş sözlər məni təmin/qane etmir*; 3. ləzzət/həzz vermək, sevindirmək; **to ~ the eye/the heart** gözü/qəlbi sevindirmək; 4. yatırmaq, dayandırmaq, söndürmək *(aclığı, susuzluğu və s.)*; **to ~ *one's* hunger/thirst** özünün aclığını/susuzluğunu yatırmaq; 5. uyğun gəlmək, cavab vermək *(tələbə)*; **to ~ the demands /the conditions** tələblərə /şərtlərə cavab vermək; **to ~ a question** suala cavab vermək; 6. inandırmaq; dağıtmaq *(şübhəni və s.)*; **to ~ oneself of *smth.*** özünü bir şeyə inandırmaq, bir şeyə inanmaq; **to ~ doubts/fears/anxieties** şübhələri/qorxuları/əndişələri dağıtmaq; 7. inanmaq; **to be fully satisfied of *smth.*** bir şeyə tam inanmaq; 8. təəhhüdü/ müqaviləni/ qərarı yerinə yetirmək; 9. *hüq.* ödəmək *(borcu)*; 10. günahını yumaq/təmizləmək;
◊ **to ~ the examiners** imtahançıları razı salmaq

**satisfying** ['sætɪsfaɪɪŋ] *adj* 1. ləzzətli, ləzzət verən; **a ~ meal** ləzzətli yemək; 2. razı salan, qane edən; **a ~ result** razı salan/qane edən nəticə

**satisfyingly** ['sætɪsfaɪɪŋlɪ] *adv* 1.məmnuniyyətlə; doyunca; 2. əsaslı, inandırıcı, qaneedici; sübutlu

**saturate** ['sætʃəreɪt] *v* 1. islatmaq, hopdurmaq, canına çəkdirmək; **to ~ with *smth.*** bir şeylə islatmaq; *You'll be saturated if you go out in this rain Bu yağışda çölə çıxsan /çıxsanız, islanacaqsan/islanacaqsınız*; 2. *məc.* ...işləmək, ...keçmək; **a style ~d with affection** ədabaz /naz-qəmzəli üslub; *He is saturated with superstition Mövhumat/Xurafat onun canına işləyib*; 3. *kim.* doydurmaq; 4. *hərb.* boğmaq, yatırtmaq, susdurmaq; ciddi zərbə endirmək

**saturated** ['sætʃəreɪtɪd] *n* 1. tamamilə islanmış; *I went out in the rain and got saturated Mən yağışda çölə çıxdım və tamamilə islandım*; 2. *kim.* doymuş *(məhlul haq.)*

**saturation** [,sætʃə'reɪʃn] *n* 1. doyma, doydurma; doyma dərəcəsi; 2. hopdurma, canına çəkdirmə/hopdurma; 3. *hərb.* bir yerə toplama/yığma/cəmləmə; 4. *hərb.* yatırtma, boğma, susdurma

**Saturday** ['sætədeɪ, -dɪ] *n (qısa forması:* **Sat)** şənbə

**Saturn** ['sætə:n] *n astr.* 1. Saturn; 2. *əs.* səpin və əkinçilik Allahı

**saturnine** ['sætənaɪn] *adj* qaşqabaqlı, üzügülməz, qaraqabaq; kədər/qəm doğuran, qəmgin; **a ~ mood** qəmgin ovqat

**satyr** ['sætə(r)] *n əs.* 1. satir *(yunan əsatirində: yarı adam və yarı keçi qiyafəsində şərab və kef Allahı)*; 2. şəhvətpərəst *(adam)*, əxlaqsız, pozğun *(adam)*

**sauce**[1] [sɔ:s] *n* 1. sous *(xörək şirəsi)*; **piquant /white ~** tünd/ağ sous; **onion/tomato ~** soğan/pomidor sousu; **to make a ~** sous hazırlamaq; *What sauces go with fish? Balıqla hansı sous gedir*; 2. tündlük/kəskinlik verən/maraq doğuran şey; 3. *amer.* meyvə püresi *(əzilmiş meyvə və ya tərəvəzdən hazırlanmış yemək)*; 4. *d.d.* ədəbsizlik, qabalıq, kobudluq, hörmətsizlik; *What sause! Bu nə ədəbsizlikdir!*;
◊ **apple ~** axmaqlıq, giclik, sarsaqlıq, cəfəngiyyat; **poor man's ~** aclıq; *Hunger is the best sauce at. söz. Aclıq ən yaxşı sousdur (yəni ac olanda hər şey ləzzətli dadır)*

**sauce**[2] [sɔ:s] *v d.d.* qabarmaq, söz qaytarmaq, qaba/kobud cavab vermək, kobudluq/qabalıq etmək, ədəbsizlik göstərmək/etmək

**saucepan** ['sɔ:spən] *n* qazan

**saucer** ['sɔ:sə(r)] *n* nəlbəki; boşqab;
◊ **flying ~s** *amer.* uçan boşqablar

**saucily** ['sɔ:sɪlɪ] *adv* 1. ədəbsizcəsinə, kobud, kobudcasına; qaba, qabacasına, həyasızcasına, sırtıq-sırtıq, həyasız-həyasız, utanmaz-utanmaz; 2. cəld, cəsarətlə; sərbəst, açıq-saçıq, utanmadan; 3. işvə/qəmzə/cilvə ilə, nazla

**saucy** ['sɔ:sɪ] *adj* 1. ədəbsiz, qaba, kobud; sözqaytaran, diliuzun; **~ retort** kobud/ədəbsiz cavab; **a ~ pupil** ədəbsiz/qaba şagird; **to have a ~ tongue** ədəbsiz/kobud/qaba danışmaq; **to be ~ with *smb.*** bir kəsə qarşı qaba/kobud olmaq; 2. zirək, cəld, diribaş; **a ~ fellow** zirək/diribaş oğlan; 3. oynaq; **~ tune/air** oynaq melodiya/mahnı; 4. nazlı, qəmzəli, nazlı-qəmzəli; **~ glance /smile** nazlı-qəmzəli baxış/təbəssüm; 5. *d.d.* qəşəng, modalı, son moda ilə tikilmiş; **a coat of ~ cut** son moda ilə biçilmiş/tikilmiş palto

**sauerkraut** ['sauəkraut] *n* turşukələm, turşuya qoyulmuş kələm

**sauna** ['saunə, 'sɔ:nə] *n* sauna *(isti hamam)*; **to sit in the ~** saunada oturmaq

**saunter**[1] ['sɔ:ntə(r)] *n* 1. gəzinti; **to go for ~, to have a ~** gəzintiyə getmək/çıxmaq; 2. yavaş-yavaş gəzmək; **to come along at ~** yavaş-yavaş gəlmək



**saunter**[2] ['sɔ:ntə(r)] *v* tələsmədən gəzmək/gəzib dolanmaq, ayaqseyrinə çıxmaq; **to ~ down the road** tələsmədən yol aşağı gəzmək; **to ~ through the town** tələsmədən şəhərdə gəzib dolaşmaq; *He sauntered by with his hands in his pockets O, əlləri cibində gəzib dolandı*; **to ~ lazily** tənbəl-tənbəl gəzmək/gəzib dolanmaq; **to ~ through life** özünü çətin işə vermədən yaşamaq, ömür boyu boş-bikar gəzmək/veyllənmək/avara gəzmək

**sausage** ['sɔsɪdʒ, 'sɔ:sɪdʒ] *n* 1. kolbasa; **pork /beef ~** donuz/ mal ətindən hazırlanmış kolbasa; **to grill some ~s** bir az kolbasa qızartmaq; 2. sosiska *(nazik kolbasa)*; *We often eat sausage for breakfast Biz tet-tez səhər yeməyində sosiska yeyirik;*
◊ **not a ~** heç nə/şey; *–Did you buy anything? –Not a sausage Bir şey aldınmı?/aldınızmı? –Heç nə*

**savage**[1] ['sævɪdʒ] *n* 1. vəhşi, barbar; *The savages burn books Vəhşilər/Barbarlar kitabları yandırırlar*; 2. qəddar/ zalım/mərhəmətsiz adam; 3. kobud/qaba/tərbiyəsiz adam; **the young ~s of Wall Street** Uoll Stritin tərbiyəsiz gəncləri

**savage**[2] ['sævɪdʒ] *adj* 1. vəhşi, barbar; **a ~ man** vəhşi adam; **~ tribes** vəhşi/barbar qəbilələr; 2. qudurğan, sərt, qəddar, azğın; **a ~ dog** sərt it; 3. tərbiyəsiz, qaba, kobud, amansız; **~ attack** amansız hücum; **~ blow** amansız zərbə; 4. *d.d.* cinlənmiş, hirslənmiş, qəzəblənmiş, quduzlaşmış; **to get/to grow /to turn ~** cinlənmək, quduzlaşmaq, qeyzlənmək; **to make *smb.* ~** bir kəsi qeyzləndirmək/qəzəbləndirmək; 5. əhliləşdirilməmiş, vəhşi; **a ~ animal** əhliləşdirilməmiş heyvan; **~ beasts** vəhşi heyvanlar

**savage**[3] ['sævɪdʒ] *v* 1. vəhşicəsinə/amansızcasına hücum etmək; 2. kəskin surətdə/amansızcasına/quduzcasına tənqid etmək

**savagely** ['sævɪdʒlɪ] *adj* 1. vəhşi/barbar kimi, vəhşicəsinə, qəddarcasına, amansızcasına; 2. sərt, qeyzlə, qəzəblə, hiddətlə; **to be ~ criticized** amansızcasına tənqid olunmaq

**savagery** ['sævɪdʒrɪ] *n* 1. vəhşilik; **to live in a state of ~** vəhşi kimi yaşamaq; **a gradual change from ~ to civilization** vəhşilikdən tədricən mədəniyyətə keçid; 2. qəddarlıq, amansızlıq, qabalıq; **relentless ~** həddən artıq amansızlıq/qəddarlıq; **to suppress revolts with ~** üsyanı/qiyamı amansızcasına yatırmaq/boğmaq

**savannah** *(həm də* **savanna)** [sə'vænə] *n* savanna *(seyrək ağacları və kolluqları olan düzənlik)*

**save**[1] [seɪv] *n* 1. qapıçının şaybanı saxlaması *(hokkey oyununda)*; 2. hücumun qarşısını almaq *(futbol oyununda)*

**save**[2] [seɪv] *v* 1. xilas etmək, qurtarmaq; **to ~ *smb./smb.'s* life** bir kəsi/bir kəsin həyatını xilas etmək; **to ~ *smb.* from drowning** bir kəsi batmaqdan xilas etmək/ qurtarmaq; **to ~ books from a fire** kitabları yanğından xilas etmək; **to ~ *smb.* from death/danger/disgrace** bir kəsi ölümdən/təhlükədən/rüsvayçılıqdan xilas etmək; 2. qorumaq, mühafizə etmək; **to fight to ~ *one's* country** vətənini qorumaq/mühafizə etmək üçün vuruşmaq; *They fought bravely to save their country Onlar vətənlərini xilas etmək üçün cəsarətlə vuruşdular*; 3. saxlamaq, qənaət etmək, qədrini bilmək; **to ~ time /labour /money** vaxta/əməyə/pula qənaət etmək; *We saved an hour by taking the express Ekspreslə getməklə biz bir saat vaxta qənaət etdik*; 4. yığmaq, toplamaq *(pul) (həm də* **to ~ up)**; **to ~ (up) money** pul yığmaq/toplamaq; *She has never saved money O heç vaxt pul yığmayıb; He's saving up money for the journey O indi səyahətə çıxmaq üçün pul yığır/toplayır*; 5. saxlamaq; **to ~ some of the meat for tomorrow** ətin bir hissəsini sabaha saxlamaq; **to ~ *one's* best clothes for grand occasions** paltarlarının ən yaxşısını böyük bayramlar üçün saxlamaq; **to ~ the apples for the children** almaları uşaqlar üçün saxlamaq; **to ~ *one's* strength for the future** gücünü gələcəyə saxlamaq; 6. azad/xilas etmək; *This saved me much trouble and expense Bu məni çox əziyyətdən və xərcdən azad/xilas etdi*; 7. *arx.* saxlamaq; *God save you! Allah səni/sizi saxlasın!*
◊ *Save us! Ilahi! Ay Allah! Allah, Allah!* **to ~ *one's* pocket** artıq xərc etməmək/çəkməmək, artıq xərcləməmək

**save**[3] [seɪv] *prep* başqa, savayı, özgə; **all ~ him** ondan başqa/savayı hamı; *He answered all the questions save one O, birindən başqa/savayı bütün suallara cavab verdi*

**save**[4] [seɪv] *conj* əlavə, başqa, savayı; *We know nothing about her save her name Biz onun haqqında adından başqa heç nə bilmirik*

**saveloy** ['sævəlɔɪ] *n* servilad *(kolbasa növü)*

**saver** ['seɪvə(r)] *n* 1. pulyığan, yığımcıl *(adam)*; 2. artıq itkinin qarşısını alan; *Our new washing machine is a real time-and-money-saver Bizim təzə paltaryuyan maşınımız əsl vaxta və pula qənaət edəndir*

**saving**[1] ['seɪvɪŋ] *n* 1. qənaət, qənaət etmə; **~ of energy** enerji qənaəti; **~ of time** vaxt qənaəti; **~ of ten per cent** 10 faiz qənaət; **additional/considerable ~** əlavə/xeyli qənaət; 2. *pl* əmanət; yığıb saxlama; **small ~s** kiçik/az əmanət; **to keep *one's* ~s in the saving-bank** əmanətini əmanət kassasında saxlamaq; 3. xilas, xilas olma; *This was the saving of him Bu onun xilası /xilas olması idi*; 4. *hüq.* müsadirə, müsadirə etmə; ləğv etmə

**saving**[2] ['seɪvɪŋ] *adj* 1. qənaətçi, qənaətcil; qənaətkar, yığımcıl; **a ~ housekeeper** qənaətcil/yığımcıl evdar qadın; 2. xəsis, simic; bərk; 3. nicatverici, xilasedici, qurtarıcı; 4. *din.* günahlardan azad edən, günahları yuyan

**saving³** ['seɪvɪŋ] *prep* ...başqa, savayı, özgə; müstəsna/ istisna olaraq; *Saving a few stones, nothing remained of the building Bir neçə daşdan başqa/savayı binadan heç nə qalmadı; Nothing wrong with him saving a slight deafness Bir az ağır eşitməsindən başqa o tam sağlamdır*

**savingly** ['seɪvɪŋlɪ] *adv* qənaətlə, qənaətcilliklə

**savings bank** ['seɪvɪŋz'bæŋk] *n* əmanət kassası /bankı

**savory¹** ['seɪvərɪ] *n amer.* = **savoury¹**

**savory²** ['seɪvərɪ] *adj amer.* = **savoury²**

**savour¹** ['seɪvə^r] *n* **1.** xüsusi dad/iy; **pleasing /delicious/ pungent ~** xoşagələn/çox gözəl /kəskin dad; **appetizing ~** iştahagətirən/iştahaaçan/iştahagətirici dad; **2.** kəskinlik; tündlük; maraq; *I find no savour in life Mənim üçün həyatda heç bir maraq qalmayıb, Mən həyata bütün marağı itirmişəm;* **3.** çalar, çalarlıq; qoxu, iy *(qoxumuş şeyin iyi);* **a ~ of pedantry** pedantlıq çaları; **4.** *şair.* ətir, rayihə

**savour²** ['seɪvə^r] *v* **1.** ləzzətlə yemək/içmək, iştaha ilə yemək/içmək; dadına/tamına baxmaq, dadmaq; *He drank the wine slowly, savouring every drop Hər damlasından ləzzət almaq üçün o, şərabı yavaş-yavaş içdi;* **2.** ləzzət/həzz almaq; **to ~ the verses** şerdən ləzzət/həzz almaq; **3.** dadı olmaq, dadmaq; *Southern dishes always savour of garlic Cənub xörəkləri həmişə sarımsaq dadır; The soup savours onion Şorba soğan dadı verir;* **4.** əlaməti/xüsusiyyəti olmaq; sezilmək, duyulmaq; **letters that ~ of jealousy** qısqanclıq sezilən/duyulan məktublar; *His speech savours of wisdom Onun nitqində müdriklik əlaməti var, Onun nitqindən müdriklik sezilir/duyulur;* **a culture that ~s of decay** tənəzzül əlaməti olan mədəniyyət

**savoury¹** ['seɪvərɪ] *n* **1.** duzlu və tünd yemək; **2.** çərəz *(yeməkdən sonra verilən)*

**savoury²** ['seɪvərɪ] *adj* **1.** dadlı, ləzzətli, iştahaaçan, iştahagətirən; **~ food** dadlı/ləzzətli yemək; **2.** ətirli, rayihəli; **~ herbs** ətirli otlar/bitkilər; **3.** tünd, kəskin; **a ~ sauce** tünd sous; **a ~ dish** tünd xörək

**savoy** [sə'vɔɪ] *n* bükülən kələm *(həm də* **~ cabbage)**

**saw¹** [sɔ:] *n* mişar, bıçqı; **a circular ~** girdə mişar/bıçqı; **a metal ~** metal mişarı, metal kəsmək üçün mişar; **to use a ~ to cut the wood** ağacı/taxtanı mişarla kəsmək, ağac /taxta kəsmək üçün mişardan istifadə etmək

**saw²** [sɔ:] *v (pt* **sawed**; *pp* **sawn** [sɔ:n]) bıçqılamaq, mişarla/bıçqı ilə kəsmək, mişarlamaq; **to ~ a log in half** tiri/şalbanı mişarla yarı bölmək/kəsmək; **to ~ wood** ağacı/taxtanı mişarlamaq/mişarla kəsmək; **to ~ a tree down** ağacı mişarla kəsib yerə yıxmaq

**saw³** [sɔ:] **to see** *felinin pt forması*

**sawdust** ['sɔ:dʌst] *n* taxta/ağac kəpəyi, mişarağzı

**sawmill** ['sɔ:mɪl] *n* taxta/taxta-şalban zavodu

**sawn** [sɔ:n] **to saw** *felinin pp forması*

**sawtooth** ['sɔ:tu:θ] *n (pl* **-teeth** [-ti:θ]) mişar/bıçqı dişi

**sawyer** ['sɔ:jə^r] *n* mişarçı; bıçqıçı

**Saxon¹** ['sæksn] *n* sakson *(bir vaxtlar şimal-qərbi Almaniyada yaşayan xalqın nümayəndəsi)*

**Saxon²** ['sæksn] *adj* sakson; **~ kings** sakson kralları; **~ churches** sakson kilsələri

**saxophone** ['sæksəfoun] *n* saksafon *(nəfəsli musiqi aləti)*

**saxophonist** [sæk'sɔfənɪst] *n* saksafonist, saksafon çalan

**say¹** [seɪ] *n* **1.** demə, söyləmə *(fikrini, rəyini);* mülahizə, fikir, rəy; söz; **to have *one's* ~ (out)** öz fikri/rəyi/ mülahizəsi olmaq; *He has had his say O, artıq öz fikrini/rəyini söyləyib; It's now my say İndi mən öz fikrimi/rəyimi deyəcəm; Let him have his say Qoy/ Qoyun o, fikrini/rəyini söyləsin;* **2.** təsir, nüfuz, hörmət; **to have a ~ in the matter** bir işə təsiri olmaq/təsir etmək; **to have no ~ in the matter** məsələnin müzakirəsinə/ həllinə qarışmaq ixtiyarı olmamaq; *I have no say in this matter Bu məsələni mən həll etmirəm*

**say²** [seɪ] *v (pt, pp* **said** [sed]) **1.** demək; **to ~ some words** bir neçə söz demək; *She said nothing to me about it Bu barədə o mənə heç nə demədi; He said (that) his friend's name was Sam O dedi ki, onun dostunun adı Səmdir; What does he say? O nə deyir?; She said (that) she wanted to see me O dedi ki, məni görmək istəyir; I've something to say to you Mən sənə/sizə bir şey demək istəyirəm; I'll say no more Mən artıq heç nə deməyəcəyəm; He didn't say a word O heç bir söz demədi; It's generally said that... Adətən deyirlər ki,...;* **2.** danışmaq, xəbər vermək; *People say (that) the experiment was successful Danışırlar ki, təcrübə müvəffəqiyyətli olub; It's said in the papers that the treaty was signed yesterday Qəzetlər xəbər verirlər ki, müqavilə dünən imzalandı; He is said to swim well Deyirlər ki/Danışırlar ki, o yaxşı üzür;* **3.** deyilmək; *The law says Qanunda deyilir; The text of the treaty says Müqavilənin mətnində deyilir; The telegram says Teleqramda deyilir; The notice says that the show is cancelled Elanda deyilir ki, tamaşa olmayacaq-dır/təxirə salınır;* **4.** fikri/rəyi olmaq; *What have you to say to all this? Bütün bunlar haqqında fikrin/fikriniz nədir? What did he say to that? Bu barədə onun fikri/rəyi nə oldu?; What do you say to my proposal? Sən/Siz mənim təklifim haqqında nə deyə bilərsən/bilərsiniz?* **5.** əzbərdən demək, ifadəli oxumaq *(bədii əsəri);* **to ~ a poem** əzbər şer demək; **to ~ a lesson** dərsə əzbərdən cavab vermək; **to ~ *one's* prayers** dua oxumaq/etmək; **6.** ehtimal/ güman/ fərz etmək, mümkün hesab etmək; *(Let's) say Deyək ki, Məsələn; Come to my place one of these days, (let's) say Sunday Bu günlərin birində bizə gəl/gəlin, məsələn, bazar günü;* **a few people, ~ three or four** bir neçə adam, deyək ki, üç və ya dörd; *Well, say it were true, what then? Deyək ki, bu, doğrudur, onda nə olsun?;* **to ~ away** ürəyini boşaltmaq; **to ~ out** açıqdan-açığa demək; **to ~ over** təkrar etmək; **to ~ *smth.* over and over again** bir şeyi nəhayətsiz olaraq/dəfələrlə təkrar etmək;

◊ *I say! Bura bax!/baxın! Hey! Ehey! Ay! (müsahibinin diqqətini cəlb etmək üçün işlədilən çağırış, nida); I say, what's the point of all this? Bura bax/baxın, bütün bunların mənası nədir? That's to say Başqa sözlə desək, yəni;* **to ~ nothing of** bir yana qalsın; *He knows no mathematics to say nothing of cybernetics Onun riyaziyyatdan təsəvvürü belə yoxdur, kibernetika qalsın bir yana; It goes without saying Bu özlüyündə aydındır/məlumdur; What he says goes Onun sözü qanundur, Onun sözü həmişə keçir*



**saying** ['seɪɪŋ] *n* **1.** məsəl, zərbi-məsəl, aforizm, hikmətli söz; **an old ~** qədim məsəl/zərbi-məsəl/hikmətli söz; **a wise ~** müdrik məsəl/zərbi-məsəl; **2.** mülahizə, fikir, rəy; **historical ~s** tarixi fikirlər

**say-so** ['seɪsou] *n* **1.** *(adət.* **the ~**) *d.d.* mübahisəsiz/qeyd-şərtsiz nüfuz; **to have the ~** səlahiyyəti/ixtiyarı olmaq; əmr/sərəncam vermək; **2.** *d.d. amer.* əsaslandırılmamış müddəa/fikir; **3.** şayiə, xəbər

**scab¹** [skæb] *n* **1.** qartmaq, qaysaq, qabıq *(yarada);* **2.** keçəl, qotur, qoturluq; **sheep ~** qoyun qoturluğu; **3.** ştreykbrexer *(tətil edən fəhlələrin yerinə işləyərək tətili pozan fəhlə, fəhlə sinfinin mənafeyinə xain çıxan adam);* **4.** *arx.* alçaq, əclaf, namərd, yaramaz, rəzil *(adam)*

**scab²** [skæb] *v* **1.** qartmaq/qaysaq/qabıq bağlamaq *(həm də* **to ~ over**); **2.** daş yonmaq

**scabbard¹** ['skæbəd] *n* qın; **to throw/to fling away the ~** qılıncı qınından çıxartmaq; silaha əl atmaq

**scabbard²** ['skæbəd] *v* qına qoymaq *(qılıncı və s.)*

**scabbed** ['skæbd] *adj* **1.** qoturdan/keçəllikdən əziyyət çəkən; **2.** qartmaqlı, qaysaqlı, qartmaqla/qaysaqla örtülmüş; **3.** *arx.* alçaq, əclaf, rəzil, yaramaz

**scabby** ['skæbɪ] *adj* **1.** yaramaz, pis; **2.** qartmaqlı, qaysaqlı, qartmaqla/qaysaqla örtülmüş, yaralı-xoralı; **~ hands** yaralı-xoralı əllər

**scabies** ['skeɪbii:z] *n* gicişmə, qaşınma, qotur

**scabious¹** ['skeɪbɪəs] *n bot.* skabioza *(ot bitkisi)*

**scabious²** ['skeɪbɪəs] *adj* qoturluq, qotur

**scads** [skædz] *n* çox/böyük miqdar; **~ of money /people** çox miqdar pul/adam; **to make ~ of coin** bir yığın/çox miqdar pul qazanmaq

**scaffold¹** ['skæfəld] *n* **1.** eşafot *(edam kürsüsü);* ölüm cəzasına məhkum olunanların başı kəsilən kötük və bu cəzanın icra olunduğu səki, taxta meydança; dar ağacı; **to die/to perish/to end on the ~** başını ölüm kötüyünə qoymaq, dar ağacından asılmaq; **to mount the ~** edam kürsüsünə çıxmaq; **to go to the ~** dar ağacından asılmaq; **to send *smb.* to the ~** bir kəsi dar ağacından asılmağa məhkum etmək; **2.** taxtabənd, körpü *(fəhlələrin işləməsi üçün tikilən və ya təmir olunan uca binaların qabağında taxta-şalbandan və ya metaldan düzəldilən müvəqqəti qurğu)*

**scaffold²** ['skæfəld] *v* taxtabənd tikmək/düzəltmək; **to ~ a house** evin ətrafında taxtabənd düzəltmək

**scaffolding** ['skæfldɪŋ] *n* = **scaffold¹ (2-ci** *məna-da)*

**scald¹** ['skɔ:ld] *n* yanıq, yanıq yeri *(isti sudan və ya buxardan alınmış)*

**scald²** ['skɔ:ld] *v* **1.** qaynar su tökmək, pörtmək, yandırmaq *(qaynar su ilə, buğla);* **to ~ *one's* hand with hot water** isti su ilə əlini yandırmaq; **2.** qaynayana qədər qızdırmaq *(xüs. südü)*

**scalding** ['skɔ:ldɪŋ] *adj* **1.** çox isti, yandıran, qızmar; **~ hot** çox isti; **~ tea** çox isti çay; **~ pie** çox isti piroq; **~ sun** yandıran /qızmar günəş; **2.** acı; **~ tears** acı göz yaşları

**scale¹** [skeɪl] *n* I **1.** tərəzi gözü; **to turn the ~** *məc.* tərəzinin gözünü əymək, üstün gəlmək, məsələni həll etmək; *This argument turned the scale Bu dəlil məsələni həll etdi;* **2.** *pl* tərəzi *(həm də* **a pair of ~s**); **kitchen ~s** mətbəx tərəzisi; **to weight the ~s on behalf of *smb.*** məsələni bir kəsin xeyrinə həll etmək;

◊ **equal/even ~** müvazinət və ya qeyri-müəyyən vəziyyət; **to be in the ~** qətiyyətsiz olmaq; *Victory was long in the scale Uzun müddət qələbənin kim tərəfində olacağını demək çətin idi;* **to hold the ~s between two rivals** iki rəqibdən heç birinə üz görməmək/rəğbət bəsləməmək; **to hold the ~s even/equally** qərəzsiz olaraq/insafla mühakimə yürütmək

**scale** [skeɪl] *n* II **1.** *zool.* pulcuq; xal *(kəpənəklərin qanadlarında);* **fish's/snake's ~** balıq/ilan pulcuğu; **2.** qabıq; nazik pərdə/təbəqə/qabıq; **to scrape off ~** qabığı təmizləmək; **3.** ərp; **4.** dişdaşı;

◊ **to remove the ~ from *smb.'s* eyes** bir kəsin gözünü açmaq

**scale** [skeɪl] *n* III **1.** miqyas *(xəritədə, çertyojda və s. həqiqi ölçüyə görə kiçik nisbətlərdə götürülən məsafə və ölçülər);* **the ~ of a map/of a drawing** xəritənin/ çertyojun miqyası; *What's the scale of this map? Bu xəritənin miqyası necədir?/nədir?;* **2.** ölçü; vüsət, genişlik; **natural ~** təbii ölçü; **on/upon a large/a small ~** böyük/kiçik ölçüdə; **a vast/a tremendous ~ of building** tikintinin geniş/çox böyük vüsəti; **3.** şkala *(müxtəlif cihazlarda dərəcələrə bölünmüş löv-*

*həcik)*; **the ~ of a thermometer** termometrin şkalası; 4. dərəcələrə bölmə; cədvəl; **~ of wages/of pensions** əməkhaqqı/təqaüd cədvəli; 5. *mus.* qamma *(aralarında müəyyən münasibət olan həmahəng səslər sırası)*; **diatonic/chromatic/major/minor ~** diatonik/ xromatik/ major/minor qamma; **to learn *one's* ~s** qammaları öyrənmək; musiqi öyrənməyə başlamaq; 6. *rəs.* qamma *(rənglər arasında uyğunluq/ahəng)*; **a ~ of colours** rənglərin qamması /uyğunluğu; 7. səviyyə, mərhələ *(inkişaf haq.)*; vəziyyət, yer; **to be high/low in the ~ of civilization** sivilizasiyanın yüksək/aşağı mərhələsində olmaq; **to be at the top/at the bottom of the ~** yüksək/aşağı səviyyədə olmaq *(bir sahədə)*; **to be high in the social ~** cəmiyyətdə yüksək səviyyədə olmaq; **to sink/to rise in the social ~** cəmiyyətin pillələrində enmək /yüksəlmək

**scale²** [skeɪl] *v* I 1. çəkmək *(tərəzidə)*; çəkisi olmaq; **to ~ six pounds** altı funt çəkisi olmaq; 2. çəkmək; özünü çəkdirmək *(tərəzidə)*

**scale** [skeɪl] *v* II 1. təmizləmək; **to ~ fish** balıq təmizləmək; 2. qabığını almaq *(noxudun və s.)*; 3. qaşımaq, qazımaq, qaşıyıb/qazıyıb təmizləmək *(ərpi, dişdaşını və s.)*; 4. qabıq vermək, qabığı soyulmaq *(həm də **to ~ off**)*; *The skin scales after scarlet fever Skarlatin xəstəliyindən sonra dəri qabıq verir*; 5. ərp bağlamaq, ərplə örtülmək; *London smoke has scaled the stones of its buildings Londonun tikililəri tüstüdən his tutub/bağlayıb*

**scale** [skeɪl] *v* III 1. qalxmaq, çıxmaq; dırmaşmaq, dırmaşıb çıxmaq; **to ~ a wall** divara çıxmaq /dırmaşmaq; **to ~ the stairs** pilləkənləri qalxmaq/çıxmaq; **to ~ a mountain** dağa dırmaşmaq/qalxmaq; 2. müəyyən miqyasda ifadə etmək; **to ~ a building** binanın layihəsini müəyyən miqyasda çəkmək; 3. dərəcələrə bölmək /ayırmaq; **to ~ down** tədricən aşağı salmaq/endirmək; **to ~ down prices/taxes** qiymətləri/vergiləri tədricən aşağı salmaq; **to ~ up** tədricən qaldırmaq/ yüksəltmək/ artırmaq; **to ~ up wages/taxes** tədricən maaşları/ vergiləri qaldırmaq/artırmaq

**scalp¹** [skælp] *n* 1. kəllə, kəllə dərisi; **hairless ~** tüksüz kəllə, daz baş; 2. *məc.* qələbə rəmzi; **to have *smb.'s* ~** 1) bir kəsə qalib gəlmək *(mübahisədə)*; 2) bir kəsdən qisas almaq *(incikliyə görə)*; 3. dağın və ya qayanın çılpaq zirvəsi/təpəsi

**scalp²** [skælp] *v* 1. başın dərisini soymaq; 2. *məc.* bərk/kəskin surətdə tənqid etmək; ciddi cəza vermək, öldürmək; *He'll scalp me if he finds me here O məni burada tapsa, öldürəcək (yəni ciddi cəzalandıracaq)*; 3. taxılın/dənin qabığını almaq; 4. taxılı növlərə ayırmaq

**scalpel** ['skælpel] *n* cərrah bıçağı, neştər

**scamp¹** [skæmp] *n* hiyləgər, kələkbaz, haramzada, fırıldaqçı, cüvəllağı *(xüs. uşaq haq.)*; *That little scamp Jimmy has hidden my slippers again! Bu kələkbaz/ cüvəllağı Cimi mənim şapşapımı yenə də gizlədib*

**scamp²** [skæmp] *v* 1. cəld və başdansovdu işləmək; 2. iş görərkən keyfiyyətsiz materialdan istifadə etmək; 3. *amer.* xəsislik/simiclik etmək

**scamper¹** ['skæmpəʳ] *n* 1. bərk/cəld qaçma, qaçıb getmə; **to go for/to take/to have a ~ on the shore before breakfast** səhər yeməyindən əvvəl sahildə bir az qaçmaq; 2. ötəri gözdən keçirmə *(qəzeti, kitabı)*

**scamper²** ['skæmpəʳ] *v* 1. qaçmaq *(cəld, sevincək)*, bərk getmək/qaçmaq; qaçışmaq *(həm də **to ~ about**)*; *The children scampered about in the garden Uşaqlar bağda qaçışdılar*; 2. ötəri nəzər salmaq; **to ~ through a newspaper** qəzetə ötəri nəzər salmaq; **to ~ away/off** qaçmaq, əkilmək, götürülmək, daban almaq; *The rabbit scampered away/off in fright Dovşan qorxu içində qaçdı/qaçıb əkildi*

**scan¹** [skæn] *n* 1. ətraflı və diqqətlə/əsaslı tərzdə öyrənmə; 2. nəzərdən keçirilmə

**scan²** [skæn] *v* (-nn-) 1. ötəri nəzərdən keçirmək, göz gəzdirmək; **to ~ the newspaper** qəzeti nəzərdən keçirmək, qəzetə göz gəzdirmək; 2. diqqətlə baxmaq, gözdən keçirmək; **to ~ *smb's* face** diqqətlə bir kəsin üzünə baxmaq; *The sailor anxiously scanned the horizon Dənizçi təlaş içində üfüqü gözdən keçirdi*; **to ~ *smb.* from head to foot** bir kəsi başdan ayağa qədər diqqətlə nəzərdən keçirmək/süzmək; **to ~ a book closely** bir kitabı diqqətlə öyrənmək/əvvəldən axıra qədər oxumaq; **to ~ critically** tənqidi surətdə öyrənmək; 3. aydın və intonasiya ilə oxumaq; **to ~ a poem** şeri aydın və intonasiya ilə oxumaq

**scandal** ['skændl] *n* 1. qalmaqal, dava; qovğa, mərəkə, vurhaşir; biabırçılıq, rüsvayçılıq; üzüqaralıq; **political ~** siyasi qalmaqal; **to be the ~ of *one's* family** ailəsinə üzüqaralıq /rüsvayçılıq gətirmək; *What a scandal! Bu nə qalmaqaldır/biabırçılıqdır! The scandal broke in 1994 Qalmaqal 1994-cü ildə baş verdi/başladı; A series of corruption scandals led to the fall of the government Bir sıra korrupsiya qalmaqalı hökumətin dağılmasına gətirib çıxartdı*; **to bring ~ upon *smb.*** bir kəsi rüsvay etmək; 2. qeybət, dedi-qodu; **to talk ~** qeybət etmək, dedi-qodu ilə məşğul olmaq, söz gəzdirmək; *Don't listen to scandal Dedi-qoduya qulaq asma/asmayın!* 3. böhtan, iftira, şər

**scandalize, -ise** ['skændəlaɪz] *v* 1. hiddətləndirmək, özündən çıxartmaq; fitnə/çaxnaşma salmaq; 2. rüsvay/ biabır etmək; 3. qeybət etmək, söz gəzdirmək, dedi-qodu ilə məşğul olmaq

**scandalmonger** ['skændl.mʌŋgəʳ] *n* xəbərçi, sözgəzdirən, qeybətçi, dedi-qoduçu, dedi-qodu gəzdirən *(adam)*



**scandalous** ['skændələs] *adj* 1. rüsvayçı, biabırçı, utanmalı, utanılacaq, əttökən, mənfur; **~ behaviour** rüsvayçı/biabırçı/əttökən davranış; **~ talk** əttökən/ utanmalı/biabırçı söhbət; **~ picture** rüsvayçı/ biabırçı/ utanmalı şəkil; 2. cəncəl, davakar; böhtanlı, iftiralı, böhtanla dolu; **a ~ letter** böhtanla dolu məktub; **~ rumours** böhtanla dolu/iftiralı şayiələr

**scandalously** ['skændələslı] *adv* biabırçılıqla, rüsvayçılıqla; biabırcasına, gülünc

**Scandinavian¹** [.skændı'neıvjən] *n* 1. skandinaviyalı; **the ~s** *top.i* skandinaviyalılar *(Skandinaviya yarımadası əhalisi: isveçlər, norveçlər, danimarkalılar və islandiyalılar)*; 2. *top.i* Skandinaviya dilləri

**Scandinavian²** [.skændı'neıvjən] *adj* skandinav; **~ languages** skandinav dilləri; **~ peninsula** Skandinaviya yarımadası

**scant** [skænt] *adj* 1. az, zəif, cüzi; **~ income** cüzi/az gəlir; **~ vegetation** cüzi/az yaşıllıq; **to pay ~ attention to what was said** deyilənə cüzi/az diqqət yetirmək; 2. məhdud, dar, kiçik, xırda, pis; **to meet with ~ success** cüzi uğur qazanmaq/əldə etmək; **to answer with ~ respect** hörmətsizliklə cavab vermək; **to show *smb.* ~ hospitality** bir kəsi pis qarşılamaq; **~ attendance** pis davamiyyət; 3. *arx.* xəsis, simic, dargöz

**scantily** ['skæntılı] *adv* zəif, çox zəif/az, az-maz; qeyri-kafi, kifayət etməyəcək/yetişməyəcək dərəcədə

**scantiness** ['skæntınıs] *n* cüzilik, azlıq, yoxsulluq, zəiflik, çatışmazlıq, kifayətsizlik

**scantity** ['skæntıtı] *n* = **scantiness**

**scapegoat** ['skeıpgout] *n* qapazaltı, başıqapazlı

**scapula** ['skæpjulə] *n anat.* (*pl* **-lae** [-li:]) kürək

**scapulae** ['skæpjuli:] *n* **scapula** *isminin cəm forması*

**scar¹** [ska:ʳ] *n* I 1. çapıq, kəsik/yara yeri *(dəridə)*; **a ~ on the face/cheek** üzdə/yanaqda çapıq; *There's a scar on his left cheek Onun sol yanağında çapıq/yara yeri var*; 2. dərin iz; *Such sorrow leaves a scar Belə kədər/dərd dərin iz buraxır*; 3. dərin cızıq/sıyrıntı *(ağacda, daş üzərində və s.)*

**scar** [ska:ʳ] *n* II 1. sıldırım, sıldırım qaya; 2. *coğ.* rif *(sualtı qayalar)*

**scar²** [ska:ʳ] *v* (-rr-) 1. çapıq qoymaq; cızıqla təsvir etmək; 2. çopur qalmaq; **a face ~red by smallpox** çiçəkdən çopurlu üz; 3. dərin iz buraxmaq *(dərd, kədər və s. haq.)*; 4. bitişmək *(adət. **to ~ over**)*

**scarce** [skeəs] *adj* 1. az, qeyri-kafi, qeyri-qənaətbəxş; aztapılan; **~ commodity** aztapılan mal; **~ raw** aztapılan xammal; **to be ~** kifayət qədər olmamaq, az olmaq; *Fruit will be scarce this year Bu il meyvə az olacaq*; 2. nadir, nadir halda təsadüf olunan/edilən; **~ coin/picture** nadir sikkə/şəkil;

◊ **to make oneself ~** 1) əkilmək, aradan çıxmaq, daban almaq; 2) gözə görünməməyə çalışmaq

**scarcely** ['skeəslı] *adv* 1. ancaq, ancaq-ancaq, demək olar ki; **~ ever** demək olar ki, heç vaxt; *He scarcely troubled to listen to me Demək olar ki, o mənə qulaq asmadı; I've scarcely any money Demək olar ki, mənim pulum qalmayıb; The rain continued scarcely with any pause Yağış, demək olar ki, dayanmadan/ara vermədən yağdı*; 2. yenicə... ki, güclə... ki; *Scarcely had I entered the room when the phone rang Mən yenicə otağa daxil olmuşdum ki, telefon zəng çaldı; He was scarcely dragging his feet O, ayaqlarını güclə sürüyürdü*; 3. çətin ki, güman etmirəm (ki); *He can scarcely have said so Güman etmirəm ki, o belə demiş olsun*

**scarcely... when** ['skeəslı...'wen] *conj* yenicə, güclə; *Scarcely had we reached the station when the train arrived Biz vağzala yenicə çatmışdıq ki, qatar gəldi*

**scarcity** ['skeəsıtı] *n* 1. azlıq, çatışmazlıq, çatmama; **~ of food** ərzağın çatışmazlığı; **temporary ~** müvəqqəti çatışmazlıq; *The scarcity of food forced prices up Ərzağın azlığı qiymətləri qaldırdı*; 2. nadir şey, az təsadüf edilən şey/hadisə; *The price of an old edition of a book is determined by its scarcity Kitabın köhnə nəşrinin qiyməti onun az tapılması ilə müəyyən edilir*

**scare¹** ['skeəʳ] *n* çaxnaşma, vəlvələ, təlaş, vahimə; **baseless ~** əsassız təlaş/çaxnaşma/vahimə; **war ~** müharibə vahiməsi; **to raise a ~** təlaş/vahimə/çaxnaşma salmaq; **to create a ~** təlaş/vahimə/vəlvələ yaratmaq; **to strike *smb.* with ~** bir kəsi vahiməyə/vəlvələyə salmaq; **to get a ~** *d.d.* qorxmaq; *You did give me a scare! d.d. Sən/Siz məni yaman qorxutdunuz /qorxutdunuz*

**scare²** ['skeəʳ] *v* 1. qorxutmaq, hürkütmək, bərk qorxutmaq/hürkütmək, qorxuya salmaq; diksindirmək; **to ~ *smb.*** bir kəsi bərk qorxutmaq; *A sudden noise scared the child Qəfil səs uşağı qorxutdu/diksindirdi*; **to be ~d by *smth.*** bir şeydən qorxmaq/hürkmək; *You scared me by coming in so quietly İçəri belə sakit girməklə məni qorxutdun/diksindirdin*; **to be ~d out of *one's* wits** qorxudan ağlını itirmək; 2. hürküdüb/qorxudub qaçırmaq *(həm də **to ~ away/off**)*; **to ~ birds** quşları qorxudub qaçırmaq; *The dog scared away/off the tramp İt səfili qorxudub qaçırdı*

**scarecrow** ['skeəkrou] *n* 1. uyuq, qorxuluq *(bağda, əkində)*; 2. qorxunc/bədheybət şey, div, ərdo; 3. səfil, dilənçi; cır-cındır geymiş adam

**scared** ['skeəd] *adj* qorxmuş, qorxu dolu; **a ~ face** qorxu dolu sifət; **a ~ look** qorxu dolu baxış

**scaremonger** ['skeəmʌŋgəʳ] *n* hay-küyçü, küykələkçi, çaxnaşma/ vəlvələ salan *(adam)*

**scarf¹** [ska:f] *n* 1. (*pl* **scarfs** *və ya* **scarves**) şərf; kaşne; 2. qalstuk

**scarf[2]** [ska:f] *v* şərf örtmək/geymək
**scarlet[1]** ['ska:lıt] *n* tünd-qırmızı rəng
**scarlet[2]** ['ska:lıt] *adj* tünd-qırmızı; ~ **flowers** tünd-qırmızı çiçəklər
**scarlet fever** ['ska:lıt'fi:vəʳ] *n* skarlatin *(əksərən uşaqları tutan yoluxucu xəstəlik)*
**scarlet woman** ['ska:lıtwumən] *n* fahişə, qəhbə
**scarp** [ska:p] *n hərb.* eskarp *(təpəlik yerdə tanka qarşı qazılmış xəndək)*
**scary** ['skeərı] *adj d.d.* 1. qorxunc, müdhiş, dəhşətli; 2. qorxaq; ürəksiz, ağciyər; hürkək, hürkəyən
**scathing** ['skeıðıŋ] *adj* kəskin, acı, istehzalı; yandırıcı, məhvedici, öldürücü; ~ **criticism** kəskin/öldürücü/ məhvedici tənqid; ~ **irony** acı /kəskin istehza; ~ **look** yandırıcı baxış; ~ **retort** kəskin/acı cavab; ~ **satire** kəskin/acı satira
**scathingly** ['skeıðıŋlı] *adv* kəskincəsinə, istehza ilə, acı-acı, məhvedici/öldürücü bir tərzdə
**scatter[1]** ['skætəʳ] *n* 1. səpmə, səpələmə; səpələnmə; dağılma, dağıdılma; pərən-pərən salma; 2. *fiz.* qeyri-bərabər yayma /əks etmə *(işığı, istiliyi)*
**scatter[2]** ['skætəʳ] *v* 1. səpmək, səpələmək, dağıtmaq, atmaq; tökmək; **to ~ sand** qum səpmək /tökmək; **to ~ far and wide/everywhere** hər tərəfə tökmək/atmaq; *He scattered his papers all over the room O, kağızlarını bütün otağa səpələdi/dağıtdı/tökdü*; 2. yerləşdirmək *(müxtəlif yerlərdə və məsafədə); Garrisons were scattered up and down the country Qarnizonlar bütün ölkədə yerləşdirildi*; 3. qovmaq, dağıtmaq, pərən-pərən salmaq; **to ~ the birds** quşları qovmaq/pərən-pərən salmaq; *The police scattered the crowd Polis izdihamı pərən-pərən saldı/qovdu; The birds scattered when a shot was fired Atəş açılanda quşlar pərən-pərən düşdü; The clouds scattered before the wind Külək buludları dağıtdı*; 4. pozmaq, yox /puç /məhv/alt-üst etmək *(planları, ümidləri); All our hopes and plans were scattered Bizim bütün ümidlərimiz və planlarımız puç/alt-üst oldu*; 5. **(with)** tökmək, səpmək; **to ~ the fields with seed** tarlalara toxum səpmək; **to ~ a road with gravel** yola çınqıl tökmək; 6. ətir yaymaq/saçmaq; **to ~ fragrance** ətir yaymaq; 7. dağıtmaq *(vəsaiti və s.)*; 8. bolluca/çoxlu pay vermək; *Kings scattered wealth and titles among their favourites Krallar əyanlarına bolluca pul və titullar verdilər*; 9. *fiz.* yaymaq, yayılmaq
**scatterbrain** ['skætəbreın] *n d.d.* yüngül, dəmdəməki, arsız, yelbeyin *(adam)*
**scatterbrained** ['skætəbreınd] *adj d.d.* yüngülxasiyyət, dəmdəməki, yelbeyin, arsız, boşbeyin, hərdəmxəyal
**scattered** ['skætəd] *adj* 1. atılmış, dağıdılmış, səpələnmiş; ~ **papers** atılmış/səpələnmiş kağızlar; 2. aralı, dağınıq; ~ **settlements** dağınıq yaşayış sahələri/qəsəbələri; **thinly ~ population** seyrək əhali, əhalisi az olan; ~ **trees** seyrək/bir-birindən aralı ağaclar
**scatty** ['skætı] *adj* 1. dəli, ağılsız; *This noise would drive anyone scatty Bu səs hər kəsi dəli edər*; 2. huşsuz; *Your scatty son has forgotten/left his key again Sənin/Sizin huşsuz oğlun/oğlunuz açarını yenə də unudub*
**scavenge** ['skævındʒ] *v* 1. zibil/tullantı yığmaq; 2. zibilyığan işləmək; zibillikdə qida axtarmaq *(insan və heyvan haq.)*
**scavenger** ['skævındʒəʳ] *n* 1. zibilçi, zibil/tullantı yığan *(işçi)*; 2. tullantı və ya leşlə qidalanan heyvan/quş/balıq
**scenario** [sı'na:riou] *n (pl* **-os** [-ouz]*)* 1. ssenari; 2. gələcəkdə görüləcək işin planı; **a possible/an alternative ~ for the company's future** şirkətin gələcəyi üçün mümkün /alternativ plan
**scenarist** ['si:nərıst] *n amer.* ssenarist, ssenari yazan/müəllifi
**scene** [si:n] *n* 1. hərəkətin məkanı/vaqe olduğu yer *(pyesdə, romanda və s.); The scene is in France Əhvalat Fransada baş verir/vaqe olur; The scene changes from London to Paris Əhvalatın vaqe olduğu yer Londondan Parisə keçir*; 2. səhnə, yer; **the ~ of operations** hərbi əməliyyat səhnəsi; **the ~ of battle** döyüş səhnəsi/yeri; **the ~ of the disaster** fəlakətin/bədbəxt hadisənin yeri; **on the ~ of the crime** cinayət yerində; 3. *teatr.* səhnə; **to appear/to enter on the ~** səhnəyə çıxmaq/daxil olmaq; **the famous quarrel ~** məşhur münaqişə səhnəsi; **the duel ~ in "Hamlet"** "Hamlet"də duel səhnəsi; 4. epizod *(romanda)*; **humorous ~** gülməli epizod; **memorable ~** unudulmaz epizod; 5. ciddi söhbət, qalmaqal; **to make a ~** qalmaqal qaldırmaq/salmaq; *Don't make a scene! Qalmaqal salma/salmayın!* 6. görünüş, mənzərə; **mountain/woodland/rural ~** dağ/meşə/kənd mənzərəsi; **the ~ from the window** pəncərədən görünən mənzərə; *The sunrise was a beautiful scene Günəşin doğması gözəl mənzərə idi*; 7. *çox vaxt pl* dekorasiya *(səhnə bəzəyi)*; **to change the ~s** dekorasiyanı dəyişdirmək
**scenery** ['si:nərı] *n* 1. *teatr.* dekorasiya; **rolling ~** köçürülə/yerindən tərpədilə bilən dekorasiya; 2. vəziyyət; mühit; **a change of ~** mühitin dəyişməsi *(başqa yerə səyahət nəticəsində); You want a change of scenery Sənə/Sizə mühiti dəyişmək lazımdır*; 3. mənzərə, görünüş; **mountain ~** dağ mənzərəsi; **picturesque ~** gözəl/səfalı mənzərə
**scenic** ['si:nık, 'senık] *adj* 1. səhnəyə/səhnə üçün yararlı; ~ **performances** səhnəyə/səhnə üçün yararlı tamaşalar; 2.: *teatr.* ~ **machinery** səhnə avadanlığı/ləvazimatı; **the ~ art** dram sənəti; 3. mənzərəli, gözəl, qəşəng, gözoxşayan; **the ~ attractions of this place** bu yerin səfalılığı/gözəlliyi; 4. mənzərə; **a ~ film** mənzərə filmi



**scent[1]** [sent] *n* 1. iy, qoxu, ətir, rayihə, xoş iy; **the ~ of flowers** çiçəklərin xoş ətri/rayihəsi; **the ~ of pines/newmown hey** şam ağaclarının/təzə biçilmiş otun iyi; **a musky ~** müşk iyi; **a delicate ~ of lilac** yasəmənin zərif iyi/rayihəsi; 2. ətir; **a bottle of ~** bir şüşə ətir; **to put some ~ on *one's* handkerchief** əl dəsmalına bir az ətir vurmaq; 3. iz *(həm də məc.)*; **hot ~** təzə iz/ləpir; **to be on/to follow the ~ 1)** izlə getmək; 2) düz yolda olmaq; **to get on/to pick the ~** izə düşmək; **to put *smb.* on the ~** bir kəsi izə salmaq; **to put *smb.* off the ~** bir kəsi izdən azdırmaq/çıxartmaq; **to lose the ~ 1)** izi itirmək *(tazı haq.)*; 2) doğru yoldan sapmaq/kənara çıxmaq; 4. iybilmə qabiliyyəti; **a dog's power of ~** itin iybilmə qabiliyyəti; **to get the ~ of danger** təhlükəni duymaq/hiss etmək
**scent[2]** [sent] *v* 1. iy/rayihə hiss etmək, iyləmək, qoxulamaq; **to ~ cigarette smoke** siqaret tüstüsünün iyini hiss etmək; **to ~ spring in the air** havada bahar iyi hiss etmək; 2. duymaq, iylə tanımaq, sezmək *(həm də* **to ~ out***)*; **to ~ game** ov quşunu duymaq/sezmək; *The dog scented a rat It siçovul duyub*; 3. hiss etmək, şübhələnmək, şübhə etmək/altına almaq; **to ~ danger** təhlükə hiss etmək; **to ~ a crime/treachery/a plot** cinayətdən/satqınlıqdan/sui-qəsddən şübhələnmək; 4. ətirləmək, ətir vurmaq; **to ~ a handkerchief** əl dəsmalına ətir vurmaq; **to ~ *one's* hair** saçına ətir vurmaq; 5. ətir saçmaq; *The roses scented the whole garden Qızılgüllər bütün bağa ətir saçırdı*; **to ~ about** iyləmək, qoxulamaq *(hər tərəfdən)*; **to ~ out 1)** duymaq, hiss etmək *(ov quşunu)*; 2) *d.d.* xəlvətcə öyrənmək/ bilmək
**scented** ['sentıd] *adj* 1. ətirlənmiş, ətir vurulmuş; **a ~ handkerchief** ətirlənmiş/ətir vurulmuş əl dəsmalı; 2. ətirli; **a ~ garden** ətirli bağ; **a ~ soap** ətirli sabun
**scentless** ['sentlıs] *adj* iysiz, ətirsiz; **a ~ flower** iysiz çiçək
**scepter** ['septəʳ] *n amer.* = **sceptre**
**sceptic** ['skeptık] *n fəls.* 1. skeptik *(skeptisizm tərəfdarı)*; 2. hər şeydən şübhələnən/hər şeyə şübhə ilə baxan adam
**sceptical** ['skeptıkl] *adj* skeptik, şəkk-şübhə ilə baxan, hər şeyə şübhə edən; **to be ~ about/of *smth.*** bir şeyə skeptik münasibət bəsləmək, bir şeydən şübhələnmək
**sceptically** ['skeptıkəlı] *adv* şübhə ilə, şəkkşübhə ilə
**scepticism** ['skeptısızm] *n* 1. *fəls.* skeptisizm *(obyektiv varlığın insan tərəfindən dərk edilə bilməsini inkar edən fəlsəfi cərəyan)*; 2. hər şeyə şəkk etmə, hər şeyə şübhə ilə baxma
**sceptre** ['septəʳ] *n* 1. hökmdar əsası; 2. *arx.* ali hakimiyyət, səltənət; **to hold ~** idarə/başçılıq etmək, hakim olmaq; **to lay down the ~** hakimiyyətdən əl çəkmək
**schedule[1]** ['ʃedju:l] *n* 1. siyahı; kataloq; 2. vaxt cədvəli, qrafik; **on ~** düz cədvəl üzrə, vaxtında; **according to ~** cədvələ/qrafikə uyğun olaraq, cədvəl/qrafik üzrə; **to be behind ~** cədvəldən/qrafikdən dala qalmaq, gecikmək; **a factory production ~** zavod istehsalının qrafiki/cədvəli; *Everything is running to schedule Hər şey qrafik/cədvəl üzrə gedir*
**schedule[2]** ['ʃedju:l] *adj* planlaşdırılmış; plan üzrə; ~ **time** planlaşdırılmış vaxt; ~ **work** plan üzrə/planlaşdırılmış iş
**schedule[3]** ['ʃedju:l] *v* 1. tərtib etmək *(siyahı və s.)*; daxil etmək *(kataloqa, siyahıya və s.)*; 2. cədvəl tərtib etmək, qrafikə daxil etmək; **to ~ a train** qatarı qrafikə daxil etmək; 3. *d.d.* nəzərdə tutmaq, ehtimal etmək; planlaşdırmaq; *The journey is scheduled for five days Səyahət beş günə nəzərdə tutulmuşdu; The mayor is scheduled to make a speech Merin nitqi plana daxil edilib; The train is scheduled to arrive at five a.m. Qrafikə görə qatar səhər saat beşdə gəlməlidir*
**scheduled** ['ʃedju:ld] *adj* 1. planlaşdırılmış, plana salınmış; **at ~ time** planlaşdırılmış vaxtda, cədvəl üzrə; **to arrive at the ~ time** düz cədvəl üzrə gəlmək; 2. tarif; ~ **prices** tarif qiymətləri
**schema** ['ski:mə] *n (pl* **schemata** [ski:'ma:tə]*)* sxem
**schemata** [ski:'ma:tə] **schema** *isminin cəm forması*
**schematic** [ski:'mætık] *adj* sxematik; ümumi şəkildə
**schematically** [ski:'mætıkəlı] *adv* sxematik, sxematik olaraq/tərzdə; **to show ~** sxematik olaraq/şəkildə göstərmək
**scheme[1]** [ski:m] *n* 1. plan, proyekt, proqram; **a ~ of work** işin planı/proyekti; **a ~ for a canal** kanalın proyekti; **simple ~** sadə plan/proyekt; **to draw up/to make out a ~** plan/proyekt çəkmək/cızmaq; **to lay down a ~ of education** təhsilin proqramını şərh/izah etmək; 2. sistem, quruluş; **the ~ of a symphony** simfoniyanın sistemi; **the ~ of a society** cəmiyyətin quruluşu; 3. gizli niyyət, sui-qəsd; hiylə, fırıldaq; fitnə, fəsad; **shady ~s** gizli hiylələr; **to lay a ~ to do *smth.*** bir iş görmək niyyətində/qəsdində olmaq; 4. qısa plan/konspekt; xülasə; **to give the students a ~ of work for the year** tələbələrə bir illik işin qısa planını vermək; 5. sxem, çertyoj, diaqram; 6. *pl* boş xəyallar, xəyali planlar
**scheme[2]** [ski:m] *v* 1. planlaşdırmaq, plan/proyekt hazırlamaq *(bir şey haq.)*; **to ~ a system of water supply** su təminatı üçün proyekt hazırlamaq; 2. fikirləşmək, düşünmək, fikrində qəsdində olmaq *(pis bir şeyin)*; **to ~ *smb.'s* downfall** bir kəsi devirmək üçün gizli plan fikirləşmək; 3. intriqa salmaq/aparmaq; **to ~ for power/for a post** intriqa yolu ilə hakimiyyətə/vəzifəyə sahib olmaq

**schemer** ['ski:məʳ] *n* 1. intriqaçı, fitnəçi, fəsadçı; **to be born a** ~ anadangəlmə intriqaçı/fitnəçi olmaq; 2. xəyalçı, xəyalpərvər, xəyalpərəst
**scherzo** ['skeətsou] *n (pl* **-os** [-ouz]) *mus.* skertso *(cəld çalınan kiçik musiqi əsəri)*
**schism** ['sızəm] *n* 1. təfriqə, nifaq, parçalanma, ikitirəlik; 2. *din.* bidət, küfr
**schismatic** [sız'mætık] *adj din.* dönük, kafir
**scholar** ['skɔləʳ] *n* 1. alim *(humanitar elm sahəsində)*; **distinguished/well-known** ~ tanınmış/məşhur alim; 2. filoloq; **German** ~ germanist, german dilləri üzrə mütəxəssis/alim; 3. *d.d.* dili yaxşı bilən adam; *He's a good French scholar O, fransız dilini yaxşı bilir*; 4. təqaüd /stipendiya alan, stipendiyaçı; 5. savadlı/bilikli adam; 6. şagird, davamçı
**scholarly**[1] ['skɔləlı] *adj* 1. elmi, elmli, bilikli, çox oxumuş; ~ **dispute** elmi müzakirə/mübahisə/diskussiya; **a very** ~ **man** çox elmli/bilikli adam; 2. *amer.* çalışqan, səyli, işə can yandıran; **a** ~ **pupil** çalışqan şagird
**scholarly**[2] ['skɔləlı] *adv* alim kimi, alimə xas/yaraşan bir tərzdə
**scholarship** ['skɔləʃıp] *n* 1. alimlik, oxumuşluq; erudisiya *(hər hansı bir sahədə geniş bilik)*; **a man of great** ~ böyük erudisiyası olan adam, çox bilikli/elmli adam; 2. humanitar təhsil; 3. qədim dillər və ədəbiyyat haqqında bilik; 4. təqaüd, stipendiya *(xüs. həvəsləndirici, şirnikdirici)*; **to win/to gain a** ~ təqaüd/stipendiya almaq hüququ qazanmaq; 5. humanitar elmlər
**scholastic**[1] [skə'læstık] *n* sxolast, sxolastik *(sxolastika tərəfdarı olan orta əsr alimi/filosofu)*
**scholastic**[2] [skə'læstık] *adj* 1. təhsil, məktəb; müəllim; ~ **institution** təhsil müəssisəsi; ~ **post** müəllim vəzifəsi; **the** ~ **profession** 1) tədris, dərs vermə; 2) müəllim sənəti; 2. sxolastik; ~ **philosophy** sxolastik fəlsəfə; ~ **style** sxolastik üslub; 3. oxumuş, təhsili olan, təhsil almış; ~ **education** universitet təhsili
**scholasticism** [skə'læstısızm] *n* 1. sxolastika; 2. doqmatizm, ehkamçılıq
**school**[1] [sku:l] *n* I 1. məktəb; təhsil müəssisəsi; **day/night/evening** ~ gündüz/gecə/axşam məktəbi; **elementary/primary** ~ ibtidai məktəb; **junior** ~ aşağı siniflər; **higher** ~ ali məktəb; **secondary**/*amer.* **high** ~ orta məktəb; 2. təhsil; **free** ~ pulsuz təhsil; **to go to** ~ 1) məktəbə getmək, məktəbdə oxumaq; 2) məktəbə daxil olmaq; **to leave** ~ məktəbi atmaq, oxumağa son qoymaq; *What school were you at? Sən/Siz hansı məktəbi qurtarmısan?/qurtarmısınız?*; 3. dərs *(məktəbdə)*; **to be in** ~ dərsdə olmaq; **to miss** ~ dərs buraxmaq; *School begins at 8 a.m. Dərs(lər) səhər saat 8-də başlanır*; **to arrive ten minutes before** ~ dərsin başlanmasına on dəqiqə qalmış gəlmək; *There will be no school tomorrow Sabah dərs yoxdur/olmayacaq*; **after** ~ dərsdən sonra; 4. sinif otağı; **big** ~ məktəb zalı; **chemistry** ~ kimya otağı; 5. elmi-tədqiqat institutu;
◊ **to keep a** ~ 1) özəl məktəbin direktoru olmaq; 2) məktəb sahibi olmaq; **to tell tales out of** ~ bir kəsin sirrini açmaq, dedi-qoduçuluqla məşğul olmaq
**school** [sku:l] *n* II 1. sürü; 2. balıq sürüsü/karvanı; 3. *arx.* izdiham, yığın, dəstə, camaat; **a** ~ **of children** bir dəstə uşaq
**school**[2] [sku:l] *adj* məktəb; tədris; ~ **age** məktəb yaşı; ~ **children** məktəb uşaqları; ~ **library** məktəb kitabxanası; ~ **year** tədris ili; ~ **friend** məktəb dostu
**school**[3] [sku:l] *v* I 1. yüyənləmək, noxtalamaq; cilovlamaq, cilovunu çəkmək; **to** ~ **a horse** at yüyənləmək/cilovlamaq; **to** ~ *one's* **feelings** hisslərini cilovlamaq; 2. öyrətmək, öyrəşdirmək, alışdırmaq; məşq etmək, tərbiyə etmək; **to** ~ **oneself to do** *smth.* özünü bir şey etməyə öyrətmək; 3. öyrətmək, təlim etmək *(heyvanı)*; 4. *arx.* məktəbə göndərmək, təhsil vermək; *He was sent to be schooled Onu oxumağa göndərdilər*; 5. *arx.* məktəbdə dərs demək/vermək
**schoolbook** ['sku:lbuk] *n* dərslik, dərs vəsaiti
**schoolboy** ['sku:lbɔı] *n* məktəbli oğlan
**schoolchild** ['sku:ltʃaıld] *n (pl* **schoolchildren** [-tʃıldrən]) məktəbli uşaq
**schooldesk** ['sku:ldesk] *n* parta
**schoolgirl** ['sku:lgə:l] *n* məktəbli qız
**school-house** ['sku:lhaus] *n* məktəb binası
**schooling** ['sku:lıŋ] *n* 1. təhsil, məktəbdə oxuma; *He didn't get much schooling O çox oxumadı /təhsil almadı*; 2. təhsil haqqı; **to pay for** *smb.'s* ~ bir kəsin təhsil haqqını vermək/ödəmək
**schoolmaster** ['skul,ma:stəʳ] *n* 1.məktəb müəllimi, pedaqoq; 2. məktəb direktoru və ya onun köməkçisi
**schoolmate** ['sku:lmeıt] *n* məktəb yoldaşı, bir məktəbdə oxumuş/oxuyan *(şagirdlər)*
**schoolmistress** ['sku:l,mıstrıs] *n* 1. məktəb müəlliməsi; 2. məktəb direktoru *(qadın)*
**schoolroom** ['sku:lrum] *n* 1. sinif, sinif otağı, auditoriya; 2. uşaqların dərs hazırladığı otaq
**school-teacher** ['sku:l,ti:tʃəʳ] *n* məktəb müəllimi/müəlliməsi
**science** ['saıəns] *n* 1. elm; **exact** ~ dəqiq elm; **social** ~**s** ictimai elmlər; **the** ~ **of language** dil haqqında elm; **the classification of** ~**s** elmlərin təsnifi; **man of** ~ alim, elm adamı; **the methods of** ~ elmi metodlar; **the progress of** ~ elmin inkişafı/inkişaf etməsi; 2. *top.i* təbiət elmləri *(həm də* **natural** ~**s)**; **physics, chemistry and other** ~**s** fizika, kimya və digər təbiət elmləri
**science-degree** ['saıənsdı'gri:] *n* elmi dərəcə
**scientific** [,saıən'tıfık] *adj* elmi; **a** ~ **discovery /research** elmi kəşf/tədqiqat; **a** ~ **adviser** elmi məsləhətçi; ~ **classification** elmi təsnifat; ~



**method/principle** elmi metod/prinsip; ~ **men** alimlər
**scientifically** [,saıən'tıfıklı] *adv* elmi; elmi surətdə/ cəhətdən/baxımdan
**scientist** ['saıəntıst] *n* alim; **top** ~**s** aparıcı alimlər; **nuclear** ~**s** atom alimləri; atomla məşğul olan alimlər
**scissor** ['sızəʳ] *v* qayçı ilə kəsmək; **to** ~ **a photograph out of the newspaper** fotonu qəzetdən qayçı ilə kəsib götürmək; **to** ~ **off a piece of cloth** qayçı ilə bir qırıq parça kəsmək
**scissors** ['sızəz] *n (ancaq cəm formada işlənir, Azərbaycan türkcəsinə təkdə tərcümə edilir)* qayçı *(adət.* **a pair of** ~*)*
**scleroses** [sklə'rousız] **sclerosis** *isminin cəm forması*
**sclerosis** [sklə'rousıs] *n (pl* **-ses**) *tib.* skleroz; ~ **of the arteries** damarların sklerozu, arterioskleroz *(ürək-damar sistemi xəstəliyi)*
**sclerotic** [sklə'rɔtık] *adj tib.* skleroz
**scobs** [skɔbz] *n pl* 1. mişarağzı, taxta kəpəyi, yonqar, sıyrıntı; 2. şlak, pas, yanıq dəmir *(qızardılmış metal üzərində əmələ gələn oksid)*
**scoff**[1] [skɔf] *n* 1. istehza, masqara, rişxənd, ələ salma, lağa qoyma; acı gülüş/istehza, kinayə; **to aim** ~**s at** *smb./smth.* bir kəsə/bir şeyə rişxənd etmək; bir kəsi/bir şeyi masqaraya qoymaq; 2. gülünc yerinə qoyma, lağ obyekti olma, lağ obyektinə çevrilmə; **to be the** ~ **of the town** şəhərin lağ obyekti olma/obyektinə çevrilmə
**scoff**[2] [skɔf] *v* I ələ salmaq, masqaraya/lağa qoymaq, istehza/rişxənd etmək, gülmək; **to** ~ **at** *smb.* bir kəsi ələ salmaq/masqaraya/lağa qoymaq; **to** ~ **at** *smth.* bir şeyə gülmək/bir şeyi masqaraya qoymaq; **to** ~ **at** *smb.'s* **ideas** bir kəsin fikrinə gülmək/fikrini masqaraya/lağa qoymaq, bir kəsin fikrinə rişxənd etmək
**scoff** [skɔf] *v* II acgözlüklə yemək; **to** ~ *smth.* bir şeyi acgözlüklə yemək
**scoffer** ['skɔfəʳ] *n* istehzaçı, rişxəndçi, masqaraçı, adamoynadan, adam ələ salan
**scoffing** ['skɔ:fıŋ] *adj* istehzalı, kinayəli, acı; ~ **laughter** istehzalı/kinayəli gülüş; ~ **smile** istehzalı/kinayəli təbəssüm
**scoffingly** ['skɔ:fıŋlı] *adv* istehza ilə, ələ salaraq, istehzalı-istehzalı, kinayəli-kinayəli
**scold**[1] [skould] *n* deyingən adam *(xüs. qadın)*
**scold**[2] [skould] *v* 1. danlamaq, qınamaq, məzəmmətləmək, məzəmmət etmək; söymək, abrını almaq; **to** ~ **a naughty child** dəcəl uşağı danlamaq; **to** ~ **a servant** xidmətçini qınamaq/danlamaq, xidmətçinin abrını almaq; **to** ~ *smb.* **for** *smth.***/for doing** *smth.* bir kəsi bir şeyə görə/bir şey etdiyinə görə danlamaq; 2. deyinmək, donquldanmaq, mırıldanmaq; **to be always** ~**ing** həmişə deyinmək/donquldanmaq
**scolding** ['skouldıŋ] *n* 1. bərk məzəmmət/töhmət, qulaqburması; **to give** *smb.* **a good** ~ bir kəsə yaxşıca qulaqburması vermək; 2. deyinmə, donquldanma, mırıldanma; dava; **constant** ~ aramsız/davamlı deyinmə
**scoop**[1] [sku:p] *n* 1. çalov; xəkəndaz; **grocer's** ~ baqqal çalovu; 2. əl beli/lopatkası; 3. parç, tayqulp; 4. çömçə, abgərdən; çanaq *(ekskavatorda)*; 5. çıxartma; götürmə; **in/at one** ~ bir götürmədə/dəfədə; *He earned a lot of money in one scoop d.d. Bir dəfədə o xeyli /çoxlu pul qazandı*; 6. *amer. d.d.* çoxlu pul, böyük qazanc
**scoop**[2] [sku:p] *v* 1. qazımaq, qazıb çıxartmaq *(həm də* **to** ~ **out)**; **to** ~ **(out) a hole in the sand** qumda quyu qazımaq; 2. çıxartmaq, götürmək *(çalovla)*; 3. *amer. d.d.* böyük qazanc/gəlir götürmək; **to** ~ **a large profit** böyük gəlir götürmək/əldə etmək; **to** ~ **in** yığmaq, götürmək *(çalovla)*
**scoot** [sku:t] *v* qaçmaq, yüyürmək; *I'll better scoot or I'll be late Yaxşısı budur mən qaçım, yoxsa gecikəcəm*
**scope** [skoup] *n* 1. hüdud, sərhəd, çərçivə *(imkan, bilik, anlama və s. haq.)*; **the** ~ **of investment** kapital qoyuluşu imkanı; **the** ~ **of** *smb.'s* **knowledge** bir kəsin biliyinin hüdudu; **a mind of wide/of limited** ~ geniş/dar ağıl; *It's outside the scope of our authority Bu bizim səlahiyyətimizdən xaricdir/kənardır, Buna bizim ixtiyarımız çatmır*; 2. sahə; **the** ~ **of** *smb.'s* **activities** bir kəsin fəaliyyət sahəsi; **the** ~ **of geography** coğrafiya sahəsi; 3. imkan; **to give** *smb.* **full/ample/wide** ~ **for** *smth.* bir kəsə bir şey üçün tam/geniş imkan vermək; **to have full/free** ~ **to act/for** *one's* **activities** fəaliyyət üçün tam imkana malik olmaq
**-scope** [-skoup] *n Alət və ya cihaz adı bildirən terminlərin yaradılmasında istifadə edilir; Azərbaycan türkcəsində* **-skop** *komponentinə uyğun gəlir:* **microscope** mikroskop, **telescope** teleskop
**-scopy** [-skoupı] *n mürəkkəb söz-terminlərin komponenti; Azərbaycan türkcəsində* **-skopiya** *komponentinə uyğun gəlir:* **microscopy** mikroskopiya, **radioscopy** radioskopiya
**scorch**[1] [skɔ:tʃ] *n* 1. yanıq, yanıq yeri; yanıq izi /ləkəsi; 2. *d.d.* son dərəcə bərk/sürətlə sürmə *(maşını və s.)*
**scorch**[2] [skɔ:tʃ] *v* 1. yandırmaq; **to** ~ *one's* **face/***one's* **hand/fingers** üzünü/əlini/ barmaqlarını yandırmaq; *I scorched my shirt when I was ironing it Ütüləyərkən mən köynəyimi yandırdım*; 2. yaralamaq, bərk toxunmaq *(bir kəsə kəskin tənqid, istehza və s. etməklə)*; 3. sürətlə/bərk sürmək *(maşını və s.)*
**scorcher** ['skɔ:tʃəʳ] *n* 1. bərk isti gün; 2. *d.d.* dəlibaş, dəlisov *(avtomobil sürücüsü və s. haq.)*; 3. *d.d.* acı istehza, təhqiredici irad, öldürücü kinayə
**scorching**[1] ['skɔ:tʃıŋ] *adj* 1. yandıran, yandırıcı,

bərk/çox isti; **a ~ day** bərk isti gün; *It's scorching outside Bayırda bərk istidir*; **~ glance** yandırıcı baxış; **~ wind** bərk isti külək; 2. kəskin, amansız; acı; **~ criticism** kəskin/amansız tənqid; **~ sarcasm** amansız istehza; **~ irony** acı rişxənd/istehza

**scorching[2]** [ˈskɔ:tʃɪŋ] *adv* dözülməz/qatlaşılmaz dərəcədə, son dərəcə bərk, şiddətli bir surətdə; *It's scorching hot today Bu gün dözülməz dərəcədə/son dərəcə istidir*

**score[1]** [skɔ:ʳ] *n* 1. *id.* hesab, yığılmış xalların miqdarı; *What's the score now İndi hesab neçədir?; The final score was 4-3 Son hesab 4-3 idi*; **a high/a low ~** yuxarı/ aşağı hesab; *There was no score Hesab açılmadı*; 2. dərin iz; yara/bıçaq/kəsik yeri *(dəridə)*; kərtik, çərtik, çapıq, kəsik; **numerous deep ~s** çoxlu dərin kərtiklər/ çapıqlar; **~s on rock** qayanın səthində izlər; **the ~s of the whip** qamçının izləri; *The scores of the whip showed on his back Onun bədənində qamçı yarasının izləri vardı; There were deep scores of pain and sorrow on her face Onun üzündə dərin dərd və kədər izləri vardı*; 3. haqq-hesab, borc *(adət. restoranda və s.)*; **to run up a ~** borca düşmək; **to pay/to wipe off ~s/a ~** borcu ödəmək/vermək; **to quit ~s with smb.** bir kəslə hesablaşmaq; **to pay off/to settle old ~s** köhnə hesabı çürütmək *(heyf almaq)*; *I've some old scores to settle with that fellow Mənim o oğlanla çürüdüləsi bəzi köhnə haqq-hesabım var*; 4. səbəb, əsas; *On what score? Nə səbəbdən? Nə əsasa?*; **to reject smth. on the ~ of absurdity** bir şeyi mənasızlığına görə/mənasız olması səbəbindən rədd etmək, **on that ~** 1) bu səbəbdən; 2) bu baxımdan; *Make yourself easy on that score Bu cəhətdən sən/siz arxayın ol/olun; I've no doubts on that score Bu baxımdan mənim heç bir şübhəm yoxdur*; 5. iki on, iyirmi; **two ~s of eggs** qırx yumurta; 6. çoxlu, külli miqdar; **~s of time** çoxlu vaxt; 7. *d.d.* uğur, müvəffəqiyyət; qələbə; *That was an easy score O, asan qələbə idi*; 8. həqiqi fakt, işlərin əsl vəziyyəti; **to know the ~** işlərin əsl vəziyyətini bilmək; 9. *mus.* partitura *(çoxsəsli musiqi əsərinin bütün əsas partiyalarının məcmusu)*; 10. kinofilmin musiqi ilə müşayiəti;

◊ **to make a ~ off one's own bat** bir şeyi kənar kömək olmadan etmək; *Death pays all scores at. söz. Ölüm bütün borcları ödəyir /çürüdür ≅Keçi öldü, qoturu kəsildi*

**score[2]** [skɔ:ʳ] *v* 1. *id.* hesabı açmaq, xal yığmaq; **to ~ a goal** qol vurmaq; **to ~ a point** xal yığmaq/götürmək; **to fail to ~** hesabı açmamaq; *Neither side scored Heç bir tərəf (komanda) hesabı açmadı, Komandalar heç-heçə oynadılar*; 2. qalib gəlmək, üstünlük/uğur qazanmaq; **to ~ a success** qalib gəlmək; *The movie scored an instant success Film dərhal uğur qazandı*; 3. kərtik açmaq *(bir şeyin üzərində)*; 4. cinsi əlaqədə olmaq *(kişi haq.)*; *Did you score (with her) last night? Sən/Siz onunla keçən gecə cinsi əlaqədə oldunmu?/oldunuzmu?*; 5. *amer. d.d.* bərk danlamaq/tənbeh etmək, kəskin tənqid etmək; qulaqburması vermək; **to ~ down** nişanlamaq, nişan vurmaq/qoymaq; **to ~ out** altından xətt çəkmək; *The name and date have been scored out Adın və tarixin altından xətt çəkilib*; **to ~ up** bir kəsin hesabına/ayağına yazmaq *(adət. mağazada, restoranda və s.)*; **to ~ up a debt against/to smb.** bir kəsin ayağına borc yazmaq

**scorer** [ˈskɔ:rəʳ] *n* 1. xal sayan, marker *(bilyard oyununun hesabını aparan adam)*; 2. qol vuran oyunçu, qolun müəllifi

**scoring-area** [ˈskɔ:rɪŋˌeərɪə] *n* cərimə meydançası *(futbol oyununda)*

**scorn[1]** [skɔ:n] *n* 1. nifrət; etinasızlıq/saygısızlıq/laqeydlik göstərmə, saymama, məhəl qoymama; **to show/to hide one's ~** nifrətini büruzə vermək/gizlətmək; **to evoke ~** nifrət oyatmaq; **to hold smb./smth. in ~** bir kəsə/bir şeyə nifrət etmək; **to have/to feel ~ for smb./smth.** bir kəsə/ bir şeyə niyfrət bəsləmək; *I feel nothing but scorn for cowardice Mən qorxaqlığa nifrət edirəm/bəsləyirəm*; **to treat smb. with ~** bir kəslə etinasız/saygısız davranmaq, bir kəsi saymamaq, bir kəsə məhəl qoymamaq; **to be filled with ~** nifrətlə dolu olmaq; 2. nifrət obyekti olmaq; **to be a ~ to smb, to be the ~ of smb.** bir kəsin nifrət obyekti olmaq

**scorn[2]** [skɔ:n] *v* 1. nifrət etmək; 2. etinasızlıq/ saygısızlıq/ laqeydlik göstərmək; **to ~ a piece of advice** məsləhətə etinasızlıq göstərmək/məhəl qoymamaq; **to ~ a proposal** təklifə etinasızlıq göstərmək; **to ~ smb.'s help/smb.'s assistance** bir kəsin köməyinə etinasızlıq göstərmək/məhəl qoymamaq; 3. özünə sığışdırmamaq; **to ~ to ask for help** kömək istəməyi özünə sığışdırmamaq; **to ~ to do/doing smth.** bir şeyi etməyi özünə/öz ləyaqətinə sığışdırmamaq; 4. *arx.* ələ salmaq, istehza etmək, masqaraya/lağa qoymaq

**scornful** [ˈskɔ:nfl] *adj* nifrətli, nifrət ifadə edən, həqarətli, xor; etinasız, laqeyd, saymaz, saygısız; **a ~ glance** nifrətli/nifrət ifadə edən baxış; **to be ~ of smb./smth.** bir kəsə/bir şeyə nifrət etmək; **to be ~ at other people's effort** başqa adamların səyinə etinasız/laqeyd olmaq

**scornfully** [ˈskɔ:nfəlɪ] *adv* nifrətlə, həqarətlə; etinasızlıqla, etinasızcasına, saymazyana, məhəl qoymadan; **to look at smb. ~** bir kəsə nifrətlə/həqarətlə baxmaq; *Tom looked at the girl scornfully Tom qıza nifrətlə baxdı*

**scorpion** [ˈskɔ:pɪən] *n zool.* əqrəb, çənbərquyruq

**Scot** [skɔt] *n* Şotlandiyalı

**Scotch[1]** [skɔtʃ] *n* I 1. **(the ~)** *top.i* şotlandiyalılar,



Şotlandiyada yaşayan xalq; 2. şotland dialekti; 3. *d.d.* şotland viskisi; **a glass of ~** bir qədəh şotland viskisi

**scotch** [skɔtʃ] *n* II kəsik, çərtik, kəsmə; kərtik; çapıq; dərin yara

**Scotch[2]** [skɔtʃ] *adj* Şotlandiya, şotland; **~ mountains** Şotlandiya dağları; **~ whisky** şotland viskisi

**scotch[3]** [skɔtʃ] *v* I 1. kəsmək, çərtmək *(üzdən)*, yaralamaq; 2. zərərsizləşdirmək, zərərsiz hala salmaq, sıradan çıxartmaq; 3. yatırtmaq; **to ~ a mutiny** üsyanı yatırtmaq; 4. yox/məhv etmək; **to ~ rats** siçovulları məhv etmək

**scotch** [skɔtʃ] *v* II son qoymaq, dayandırmaq; *His appearance in public scotched rumours that he had fled the country İctimaiyyət içində görünməsi onun ölkədən qaçması haqqındakı şayiələrə son qoydu*

**Scotchman** [ˈskɔtʃmən] *n (pl* **-men** [-mən]) şotlandiyalı *(kişi)*

**Scotchwoman** [ˈskɔtʃˌwumən] *n (pl* **-women** [-ˌwɪmɪn]) şotlandiyalı qadın/qız

**scot-free** [ˈskɔtˈfri:] *adj* cəzasız, tənbehsiz, cəzası verilməmiş; sağ-salamat, toxunulmamış

**Scotland Yard** [ˈskɔtləndˈja:d] *n* Skotlandyard *(Londonda baş polis idarəsi, xüs. cinayət axtarışı üzrə)*

**Scots** [skɔts] *n* 1. **(the ~)** *top.i* şotlandiyalılar, Şotlandiyada yaşayan xalq; 2. Şotlandiya dialekti; **to speak ~** şotland dialektində danışmaq

**Scotsman** [ˈskɔtsmən] *n* = **Scotchman**

**Scotswoman** [ˈskɔtsˌwumən] *n* = **Scotchwoman**

**Scottish** [ˈskɔtɪʃ] *adj* Şotlandiya, şotland; **~ history/ literature** Şotlandiya tarixi/ədəbiyyatı; **~ dancing** Şotlandiya/şotland rəqsi; **~ accent** Şotlandiya aksenti; **to speak with a ~ accent** Şotlandiya aksenti ilə danışmaq

**scoundrel** [ˈskaundrəl] *n* yaramaz, əclaf, alçaq, namərd *(adam)*

**scour[1]** [ˈskauəʳ] *n* 1. təmizləmə, yuma; **to give a saucepan/a pan a good ~** qazanı/tavanı yaxşı-yaxşı yumaq; 2. yuyub aparma; *The scour of the river has affected the foundations of the bridge Çay suyunun güclü təzyiqi körpünün əsaslarını yuyub aparıb*; 3. *bayt.* dizenteriya

**scour[2]** [ˈskauəʳ] *v* I 1. təmizləmək; sürtmək, sürtüb təmizləmək; **to scrub and to ~** qaşımaq və sürtüb təmizləmək; **to ~ with sand** qumla sürtüb təmizləmək; **to ~ with soap** sabunla yuyub təmizləmək; **to ~ clean** tərtəmiz yumaq; **to ~ pots and pans** qazanları və tavaları sürtüb təmizləmək; **to ~ down the steps** pillələnləri axıra qədər tərtəmiz yumaq; 2. azad etmək, təmizləmək; **to ~ sea of the enemy ships** dənizi düşmən gəmilərindən azad etmək/təmizləmək; 3. *d.d.* işlətmə dərmanı vermək; **to ~ a horse/a cow** ata/inəyə işlətmə dərmanı vermək; 4. ləti-ni təmizləmək *(dərinin)*; 5. *arx.* qamçılamaq, ifşa/tənqid etmək; **to ~ away** təmizləmək, sürtüb təmizləmək/aparmaq; **to ~ away a stain** sürtüb ləkəni təmizləmək/aparmaq; **to ~ off** sürtüb pası təmizləmək

**scour** [ˈskauəʳ] *v* II 1. vurnuxmaq, özünü ora-bura vurmaq *(bir şeyi axtararaq)*; qaçmaq; **to ~ after smb.** bir kəsin dalınca çaparaq getmək /yüyürmək; 2. diqqətlə axtarmaq *(bir şeyi)*; **to ~ a book for quotations** sitatlar üçün kitabı diqqətlə nəzərdən keçirmək; **to ~ the country for smb.** bir kəsi ölkənin hər yerində axtarmaq; **to ~ away/off** qeyb olmaq, qaçmaq

**scourer** [ˈskauərəʳ] *n* I mətbəx qablarını təmizləmək üçün lif

**scourge[1]** [skə:dʒ] *n* 1. qamçı, şallaq, tatarı, qırmanc; 2. cəza, bəla, fəlakət; **the divine ~** Allah cəzası/bəlası; **the ~ of war/of disease/of famine** müharibənin/xəstəliyin/ aclığın fəlakəti; *War is the greatest scourage Müharibə ən böyük fəlakətdir; Flies and wasps are a regular scourge in summer Milçəklər və arılar yayda əsl bəladır*;

◊ **the white ~** vərəm xəstəliyi

**scourge[2]** [skə:dʒ] *v* 1. qamçılamaq, şallaqlamaq, qamçı ilə/şallaqla vurmaq; 2. cəzalandırmaq, cəza vermək; **to ~ oneself** özünü cəzalandırmaq, özünə cəza vermək

**scout[1]** [skaut] *n* 1. *hərb.* kəşfiyyatçı; kəşfiyyatçı təyyarə/gəmi; **to go on the ~** kəşfiyyata getmək; 2. *geol.* kəşfiyyatçı; **geological ~** kəşfiyyatçı geoloq; 3. *amer. d.d.* oğlan, yoldaş; **a good ~** yaxşı/etibarlı yoldaş

**scout[2]** [skaut] *v* I kəşfiyyat aparmaq, öyrənmək, araşdırmaq, axtarmaq, tədqiq etmək, müşahidə aparmaq

**scout** [ˈskaut] *v* II rədd etmək, etinasızlıq/ laqeydlik/ saygısızlıq göstərmək; **to ~ a proposal** təklifi rədd etmək, təklifə etinasızlıq göstərmək

**scouting[1]** [ˈskautɪŋ] *n hərb.* kəşfiyyat, kəşfiyyat aparma

**scouting[2]** [ˈskautɪŋ] *adj hərb.* kəşfiyyat, kəşfiyyatçı, kəşfiyyat aparan; **~ force** kəşfiyyat dəstəsi/qrupu; **~ post** kəşfiyyat postu

**scowl[1]** [skaul] *n* 1. acıqlı/hirsli/qəzəbli/kinli baxış; **to look at smb. with a ~** bir kəsə acıqla/hirslə/qəzəblə baxmaq; 2. qaşqabaqlı görkəm

**scowl[2]** [skaul] *v* 1. acıqla/hirslə/qəzəblə baxmaq, acıqlı/ hirsli/kinli nəzər salmaq, acıqlı-acıqlı/kinli-kinli/ hirsli-hirsli/qəzəbli-qəzəbli baxmaq; **to ~ at smb.** bir kəsə acıqlı-acıqlı baxmaq; 2. qaşqabağını tökmək, üz-gözünü turşutmaq, sımsırığını/qaşqabağını sallamaq; *He made no reply, but simply scowled O heç bir cavab vermədi, sadəcə olaraq qaşqabağını salladı/üz-gözünü turşutdu*

**scowlingly** [ˈskaulɪŋlɪ] *adv* qaşqabaqla, qaşqabaqlı, hirslə, hirsli-hirsli, acıqlı-acıqlı, hirsli /acıqlı halda

**scrabble** [ˈskræbl] *v* 1. qurdalanmaq, eşələnmək; axtarmaq, araşdırmaq; *She scrabbled in her bag*

*for her spectacles O, çantasında eynəyini axtardı;* **2**. cırmaqlamaq, qazımaq *(heyvan haq.)*; **3**. cızmaq, cızma-qara etmək

**scraggy** [ˈskrægı] *adj* arıq, sısqa, cılız; **~ sheep** arıq qoyunlar; **~ meat** arıq ət

**scramble**[1] [ˈskræmbl] *n* **1**. dırmaşma; **a ~ over the rocks** qayalara dırmaşma; **2**. əlbəyaxa, döyüşmə, vuruşma, dava-dalaş; qızğın mübahisə; mübarizə; **a ~ for new lands** yeni torpaq ələ keçirmək üçün mübarizə; **the ~ for a living** həyat/yaşamaq uğrunda mübarizə; **to fling oneself into the ~** özünü döyüşə/dava-dalaşa atmaq

**scramble**[2] [ˈskræmbl] *v* **1**. dırmaşmaq, dırmaşıb çıxmaq; **to ~ among rocks** qayalara dırmaşmaq; **to ~ over the wall** dırmaşıb divardan aşmaq /keçmək; **to ~ up a hill** dağa dırmaşmaq; **2**. *məc.* güclə qurtarmaq, güclə etmək *(bir şeyi)*; **to ~ out a danger** təhlükədən güclə qurtarmaq; **to ~ through difficulties** çətinliklərdən güclə qurtarmaq; **to ~ for *one's* living** yaşayışı üçün güclə pul qazanmaq; **3**. *məc.* tələsik etmək *(bir şeyi)*; **to ~ into *one's* clothes** paltarını tələsik geymək; **to ~ hurriedly through a book** kitaba cəld/tələsik baxmaq; **4**. dava-dalaş salmaq, vuruşmaq, dalaşmaq, mübarizə aparmaq *(bir şeyi əldə etmək üçün)*; **to ~ for *smth.*/ to get *smth*.** bir şeyi əldə etmək üçün vuruşmaq/mübarizə aparmaq

**scrambled eggs** [ˈskræmbldˈegz] *n* qayğanaq; omlet

**scrap**[1] [skræp] *n* I **1**. parça, qırıntı, qırıq; **a ~ of paper** kağız parçası; **only a ~ of paper** ancaq bir parça kağız, heç nəyə dəyməyən sənəd; **~s of material** parça qırıqları/tikələri; **to catch ~s of conversation** söhbətin parçalarını/qırıqlarını eşitmək; **2**. tikə, cüzi miqdar, damcı; **a ~ of hope** ümid işartısı; **not a ~** bir damcı da; **not a ~ of interest** heç bir damcı maraq da; **not a ~ of evidence** heç bir sübut; *You haven't eaten a scrap all day Sən/Siz bütün günü bir tikə də yeməmisən/ yeməmisiniz*; **3**. qalıq, artıq, qabaqdan qalan; **to give the ~s to the dog** artığı/qabaqdan qalanı itə vermək; **4**. kəsilmiş parçalar *(qəzetdən və s.)*; **to collect ~s** qəzetdən parçalar kəsib saxlamaq; **5**. *top.i* metal qırıntıları;

◊ *I don't care a scrap! Mənə əsla/qətiyyən dəxli yoxdur!, Bu mənim vecimə deyil!*

**scrap** [skræp] *n* II **1**. dalaşma, vuruşma, dava, qovğa; didişmə, söyüşmə, küsüşmə; küsülülük; **to be always ready for a ~** davaya/vuruşa həmişə hazır olmaq; **2**. boksçuların görüşü

**scrap**[2] [skræp] *v* **(-pp-)** I **1**. dəmir qırıntısına çevirmək; **to ~ an old machine/an old ship** köhnə maşını/gəmini metal qırıntılarına çevirmək/yenidən əritmək; **2**. atmaq, tullamaq *(keyfiyyətsiz, lazımsız olduğu üçün)*; **to ~ a chapter of *one's* book** kitabının bir fəslini atmaq

**scrap** [skræp] *v* **(-pp-)** II **1**. söyüşmək, dalaşmaq, deyişmək; **to ~ with *smb*.** bir kəslə dalaşmaq/söyüşmək; *He was always scrapping at school O həmişə məktəbdə dalaşırdı*; **2**. bokslaşmaq; boks qaydaları ilə yumruqlaşmaq

**scrape**[1] [skreıp] *n* **1**. qaşıma, qazıma, siyirmə, yonma; təmizləmə; **to give *one's* shoes a ~** ayaqqabılarını təmizləmək; **to give a carrot a ~** kökü təmizləmək; **2**. sıyrıntı, cırmaq, cırmaq yeri; **a ~ on the shin** dizdə sıyrıntı/cırmaq yeri; **to give *one's* hand a ~** əlini sıyırmaq/cızmaq; **3**. cırıltı, xışıltı, cığıltı; cırıldama, xışıldama, xırçıldama; **a ~ of a chair/of a bed** stulun/ çarpayının cırıltısı; **4**. *d.d.* çətinlik, xoşagəlməz vəziyyət, pis iş/hadisə, acı xəbər; pislik; **to be in a ~** pis vəziyyətdə olmaq; **to get into ~s** bəlaya/əngələ/kələyə düşmək; **to get/to lead *smb.* into a ~** bir kəsi pis vəziyyətə/bəlaya salmaq; **to get out of a ~** çətin vəziyyətdən/bəladan qurtarmaq; **5**. *d.d.* qırxma; **to give *one's* chin a ~** üzünü qırxmaq

**scrape**[2] [skreıp] *v* **1**. qazımaq, qaşımaq, təmizləmək *(həm də* **to ~ away/off**); **to ~ a dish/a plate** nimçəni/boşqabı təmizləmək *(axıracan yemək)*; **to ~ grease from pots and pans** qazanları/tavaları yağdan təmizləmək; **to ~ paint from a door/off the wall** rəngi qapıdan/divardan qaşımaq; **2**. cızmaq, soymaq, soyub qopartmaq; **to ~ *one's* knee against a stone** daşa vurub dişini cızmaq; **3**. azca/yüngülcə dəymək/toxunmaq; *The car scraped against the wall Maşın yüngülcə divara toxundu*; **4**. cırıldamaq, cızmaq; **to ~ a pen over paper** qələmlə kağızın üstünü cızmaq; **5**. qazmaq; **to ~ (out) a hole** quyu qazmaq; **to ~ away** qazıyıb təmizləmək; **to ~ away the dirt from *smth*.** bir şeydən çirki təmizləmək; **to ~ down** qaşımaq; qaşıyıb təmizləmək; **to ~ down a wall** divarı qaşıyıb təmizləmək; **to ~ together** yığmaq, toplamaq *(pul haq.)*: **to ~ together a few pounds for a holiday** məzuniyyət üçün bir neçə funt pul yığmaq;

◊ **to ~ and screw** qəpiyin üstündə əsmək, xəsislik etmək

**scraper** [ˈskreıpəʳ] *n* **1**. pis skripkaçı/skripka çalan; **2**. xəsis, simic, zıqqı; **3**. dəmir tor *(qazan və s. təmizləmək üçün)*; **4**. *tex.* qreyder *(torpaq yolları qazımaq və hamarlamaq üçün maşın)*

**scrap-heap** [ˈskræphi:p] *n* zibillik, zibilxana, zibil qutusu, zibil tökülən yer; çirkab quyusu/çalası; **to throw *smth.* on the ~** bir şeyi zibilxanaya/zibil qutusuna atmaq; **a book fits only for the ~** ancaq zibilliyə/zibilxanaya atılmalı kitab

**scrapiness** [ˈskræpınıs] *n* əlaqəsizlik, sistemsizlik, qarışıqlıq

**scrappy** [ˈskræpı] *adj* **1**. müxtəlif qalıqlardan/kəsiklərdən/ hissələrdən ibarət; **~ furniture** yığma mebel; **~ dinner** müxtəlif yemək qalıqlarından hazırlanmış nahar; **~ knowledge** qırıq-qırıq/əlaqəsiz bilik; **2**. sistemsiz, qarışıq, dolaşıq, qatma-qarışıq; **~ lecture** dolaşıq/qarışıq/sistemsiz mühazirə



**scrapyard** [ˈskræpja:d] *n* = **scrap-heap**

**scratch**[1] [skrætʃ] *n* **1**. cızıq, cırmaq yeri; sıyrıntı: **a ~ on the face/on a silver tray** üzdə/gümüş podnosda cızıq; *Her hands were covered with scratches Onun əli cızıq-cızıq idi/cızıqlarla örtülmüşdü*; **2**. cırmaqlama, cırmaqlaşma; *A dog enjoys a good scratch İt cırmaqlamaqdan həzz alır*; **3**. cırıltı, cığıltı, xışıltı, cırtıldama; **the ~ of his pen on the paper** onun perosunun kağız üzərində cırıltısı; **4**. cızma-qara, qara-qura yazı, əyri-üyrü yazı/xətt;

◊ **a ~ of the pen 1**) tələsik yazılmış bir neçə söz; **2**) imza, qol; **up to ~ 1**) lazımi səviyyədə, yaxşı vəziyyətdə; **2**) tam hazır vəziyyətdə; **to bring *smb.* (up) to the ~ 1**) *id.* bir kəsi starta çağırmaq; **2**) bir kəsi mübarizəyə məcbur etmək; **3**) bir kəsi imtahan verməyə hazırlaşdırmaq; **to come up to ~, to come to the ~ 1**) *id.* start xəttinə gəlmək; **2**) mübarizəyə hazır olmaq

**scratch**[2] [skrætʃ] *adj* **1**. *d.d.* təsadüfən ələ gələn şeylərdən düzəldilmiş; **~ collection** təsadüfi ələ gələn şeylər kolleksiyası; **~ dinner** tələsik hazırlanmış nahar; **~ majority** təsadüfi çoxluq; **2**. tələsik yazılmış/qeyd edilmiş; **~ paper** qaralama

**scratch**[3] [skrætʃ] *v* **1**. cızmaq; cırmaqlamaq; **to ~ *one's* hand with a pin/on the thorns** əlini sancaqla/tikanla cızmaq; *Cats scratch Pişiklər cırmaqlayırlar*; **2**. boşaltmaq, yumşaltmaq *(torpağı)*; **to ~ the ground with a rake** torpağı/yeri dırmıqla yumşaltmaq/boşaltmaq; **to ~ the surface 1**) üzdən qazmaq; **to ~ the pasture** çəməni/biçənəyi malalamaq; çimi əzmək; **2**) səthi öyrənmək/izah/şərh etmək; üzdən keçmək; **to ~ the surface of a subject** məsələni səthi/üzdən izah etmək; **3**. xışıldamaq, cırıldamaq; *This pen scratches badly Bu qələm çox pis cırıldayır*; **4**. çəkmək *(kibriti)*; **to ~ a match** kibrit çəkmək *(yandırmaq)*; **5**. qaşımaq; daramaq; **to ~ a dog's neck** itin boynunu qaşımaq/daramaq; **to ~ mosquito bites** ağcaqanadın dişlədiyi yerləri qaşımaq; **6**. qaşınmaq; *Itching makes one want to scratch Gicişmədən adam qaşınmaq istəyir*; **7**. tələsik/səliqəsiz yazmaq; **to ~ a few lines of a letter** tələsik bir neçə sətir məktub yazmaq; **8**. cırmaqlamaq; *The dog scratched the door İt qapını cırmaqladı*; **9**. dırnağı/caynağı ilə eşmək; *The dog is scratching as if he smelt a rat İt dırnaqları ilə yeri eşir, sanki siçovul olduğunu hiss edib*; **10**. eşələmək *(yeri)*; *The chickens were scratching for corn Cücələr dən tapmaq üçün yeri eşələyirdilər*; **11**. qazmaq, qazıyıb təmizləmək; **to ~ a hole in the ground** yerdə quyu qazmaq; **12**. pozmaq, üstündən xətt çəkmək, qaralamaq, silmək, çıxartmaq; **to ~ an item from an account** hər hansı bir bəndi hesabdan silmək/çıxartmaq; **13**. təxirə salmaq, imtina/rədd etmək; **to ~ an engagement** görüşü təxirə salmaq, görüşdən imtina etmək; **to ~ the match** oyunu/görüşü təxirə salmaq; **to ~ about** axtarmaq, eşələnmək *(bir şeyi tapmaq üçün)*; **to ~ off** silmək, pozmaq, çıxartmaq *(siyahıdan)*; **to ~ *smb.* off/from a list** bir kəsi siyahıdan çıxartmaq;

◊ **to ~ for oneself** özünü çətinlikdən çıxartmaq; çətinliyin öhdəsindən təkbaşına gəlmək; **to ~ *one's* head over** başını sındırmaq *(bir şey üzərində)*; *Scratch my back and I will scratch yours at. söz. ≅ Əl əli yuyar, əl də üzü*

**scratch-line** [ˈskrætʃlaın] *n id.* start xətti

**scratchy** [ˈskrætʃı] *adj* **1**. yöndəmsiz, əlüstü /atüstü düzəldilən, qabiliyyətsiz; **~ drawing** yöndəmsiz/atüstü çəkilmiş şəkil, cızma-qara *(pis çəkilmiş şəkil mənasında)*; **~ writing** cızma-qara, qara-qura yazı; **2**. cırıldayan, xışıldayan; **a ~ pen** cırıldayan pero/qələmucu; **3**. gicişdirən, gicişmə yaradan; **4**. qaşınan; *The dog is very scratchy today İt bu gün çox qaşınır*; **5**. hirsli; acıqlı, kinli, qəzəbli *(qadın haq.)*

**scrawl**[1] [skrɔ:l] *n* **1**. *(ancaq təkdə işlənir)* dolaşıq, çətin oxunan/oxunmaz xətt; *I could hardly read her scrawl Mən onun dolaşıq xəttini güclə/zorla oxudum*; **2**. tələsik və səliqəsiz yazılmış məktub; **3**. cızma-qara

**scrawl**[2] [skrɔ:l] *v* **1**. tələsik və səliqəsiz yazmaq; **to ~ *smth*. illegibly** bir şeyi pis xətlə/oxunmaz tərzdə yazmaq; **to ~ a hurried note/an answer** tələsik qeyd/cavab yazmaq; **2**. anlaşılmaz işarələrlə yazmaq; **to ~ all over the wall** bütün divarı anlaşılmaz işarələrlə yazıb doldurmaq

**scream**[1] [skri:m] *n* **1**. qulaq batıran səs, fəryad, nalə, fəğan, şivən, inilti; zingilti; **a ~ of terror** dəhşət fəryadı/naləsi; **a ~ of pain** ağrı iniltisi/naləsi; **to utter ~s of pain** ağrıdan fəryad qoparmaq/inildəmək; **2**. kəskin qışqırtı/çığırtı/səs; **the ~ of a peacock/of an eagle** tovuzun /qartalın qışqırtısı; *The engine had a shrill scream as it entered the tunnel Tunelə girəndə parovoz kəskin fit verdi*

**scream**[2] [skri:m] *v* **1**. qışqırmaq, çığırmaq, bağırmaq, fəryad/fəğan etmək; *The baby screamed all night Uşaq bütün gecəni qışqırdı*; **to ~ with pain** ağrıdan qışqırmaq/ bağırmaq; **to ~ with fear** qorxudan qışqırmaq/ bağırmaq/ çığırmaq; **to ~ with delight** heyrətdən qışqırmaq; **to ~ oneself hoarse** səsi batana qədər qışqırmaq; **to ~ for help** kömək üçün qışqırmaq/fəryad qoparmaq; **2**. kəskin fit vermək; ciyildəmək, vıyıldamaq; *The brakes screamed Əyləc/Tormoz ciyildədi; Machines scream Maşınlar kəskin fit verir; The wind screamed all night long Külək bütün gecəni vıyıldadı*; **3**. *d.d.* bərk gülmək, qəhqəhə çəkmək; gülməkdən qəşş etmək/ölmək; *He was so funny, he made us scream O*

*elə məzəli idi, biz gülməkdən qəşş etdik*; **to ~ with laughter** qəhqəhə çəkmək, gülməkdən qəşş etmək; 4. qamaşdırmaq; *This colour scheme screams Bu rənglərin birləşməsi/qatışığı gözü qamaşdırır*; **to ~ out** qışqırmaq, bağırmaq, qışqırıb/bağırıb çağırmaq; **to ~ out orders** kəskin səslə əmr vermək

**screamy** [ˈskri:mı] *adj* 1. zingiltili, ciyiltili, cığvığ; kəskin, güclü, qulaqbatıran; **~ voice** kəskin/qulaqbatıran səs; 2. gözəçarpan, diqqəti cəlb edən; **~ colours** gözəçarpan/diqqəti cəlb edən rənglər

**scree** [skri:] *n* çınqıl, qırmadaş; çaydaşı, qənbər

**screech**[1] [skri:tʃ] *n* 1. tutqun/xırıltılı/batıq səs; **the ~ of the monkey** meymunun xırıltılı səsi; 2. vıyıltılı; **the ~ of a saw** mişarın/bıçqının vıyıltısı

**screech**[2] [skri:tʃ] *v* 1. batıq/xırıltılı səslə qışqırmaq; **to ~ with pain** ağrıdan batıq səslə qışqırmaq, ağrıdan inildəmək; *The monkeys were screeching in the trees Meymunlar ağaclarda qışqırırdılar*; 2. ulamaq *(bayquş haq.)*; *The owl screeched Bayquş uladı*; 3. cırıldamaq; *The brakes screeched and the car suddenly stopped Tormozlar cırıldadı və maşın qəflətən dayandı*

**screed** [skri:d] *n* 1. *d.d.* uzun/darıxdırıcı məqalə/nitq və s.; 2. acı şikayət

**screen**[1] [skri:n] *n* I 1. şırma, arakəsmə; **folding ~** bükülüb-açılan şırma/arakəsmə; 2. müdafiə, örtük; pərdə; **smoke ~** tüstü pərdəsi; **under (the) ~ of night** gecənin pərdəsi altında; **to act as a ~ for *smb*.** bir kəsi gizlətmək, bir kəs üçün pərdə rolunu oynamaq; 3. *hərb* üstünü örtmə, gizlətmə; 4. *kino.* ekran; **to show a film on the ~** ekranda film göstərmək; **to put a play on the ~** pyesi ekranlaşdırmaq; 5. elan lövhəsi; 6. **(the ~)** kino, kinematoqrafiya *(kino işləri)*

**screen** [skri:n] *n* II ələk; xəlbir, şadara

**screen**[2] [skri:n] *adj* kino; **~ fan** *d.d.* kino həvəskarı; **~ star** kino ulduzu

**screen**[3] [skri:n] *v* I 1. müdafiə üçün şırmadan istifadə etmək; **to ~ the fire from *one's* face** üzünü oddan müdafiə etmək üçün şırmadan istifadə etmək; **to ~ windows to keep out mosquitoes** ağcaqanadlardan qorunmaq üçün pəncərələrə tor vurmaq; 2. gizlətmək, müdafiə etmək, qorumaq; **to ~ the real culprit** əsl cinayətkarı gizlətmək; **to ~ *smb.'s* faults** bir kəsin səhvlərini gizlətmək; **to ~ *one's* eyes from the fire** gözünü oddan qorumaq; **to ~ oneself behind *smth*.** özünü bir şeyin arxasında gizlətmək; *The sun was screened by clouds Buludlar günəşi gizlətdi*; **to ~ *smb.* from hardships** bir kəsi çətinliklərdən qorumaq; **to ~ *smb.* from suspicion/from blame** bir kəsi şübhədən/ittihamdan müdafiə etmək; 3. ekranlaşdırmaq; ekranda göstərmək/nümayiş etdirmək; **to ~ off** şırma/arakəsmə ilə ayırmaq; **to ~ off a corner of the room** otağın bir küncünü arakəsmə ilə ayırmaq

**screen** [skri:n] *v* II 1. çeşidləmək, sortlara/növlərə ayırmaq *(xüs. kömürü)*; xəlbirləmək, şadaralamaq, xəlbirdən/şadaradan keçirmək; 2. *d.d.* siyasi səbatlılığı/keçmiş fəaliyyəti/sənədləri yoxlamaq; **to be arrested and ~ed by the police** polis tərəfindən həbs olunmaq və ciddi yoxlanılmaq; 3. *d.d.* sınaqdan keçirmək, ətraflı yoxlamaq

**screening** [ˈskri:nıŋ] *n* 1. ekranlaşdırma; 2. xəlbirləmə, şadaralama, xəlbirdən/şadaradan keçirmə; 3. seçmə, yoxlama; *Many persons have been detained for screening Yoxlamaq üçün çoxlu adam saxlayıblar*

**screw**[1] [skru:] *n* vint, şrup;

◊ **a ~ loose** 1) qaydasında olmama; 2) ağlı başında olmama; *He has a screw loose Onun ağlı başında deyil, O, gicdir, Onun bir vinti çatmır*

**screw**[2] [skru:] *v* 1. vintləmək, vintlə bağlamaq /bərkitmək; **to ~ a lock on a door** qıfılı qapıya vintləmək/vintlə bağlamaq, qapıya qıfıl/kilid salmaq; 2. burmaq, burub bərkitmək; **to ~ home** axıra qədər burub bərkitmək; **to ~ a lid on a jar** qapağı burub bankaya bərkitmək; 3. vintlənmək, burulmaq, burulub bərkimək; *The handle won't screw Dəstək burulub bərkimir*; 4. sıxmaq; **to ~ water out of a sponge** qubkadan suyu sıxıb çıxartmaq; 5. zorla/hədələməklə almaq; **to ~ money out of *smb*.** bir kəsdən zorla pul almaq; **to ~ the truth out of *smb*.** bir kəsi həqiqəti deməyə məcbur etmək; 6. burmaq; **to ~ *smb.'s* arm** bir kəsin qollarını burmaq; 7. *(həm də* **to ~ up***)* əymək; **to ~ *one's* face into a smile** çəpəki gülümsəmək; 8. xəsislik/simiclik etmək; *He has screwed all his life O bütün ömrü boyu qəpiyin üstündə əsib*; 9. *tex.* yiv açmaq; **to ~ down** möhkəm/bərk/kip vintləmək; **to ~ in** vintləyib bərkitmək; **to ~ off** 1) vintini açmaq; 2) vinti boşalmaq/açılmaq; **to ~ on** vintləmək, vintlə bağlamaq *(bir yerə)*, vintlə bərkitmək; **to ~ a lock on to a door** qıfılı/kilidi qapıya vintlə bərkitmək; **to ~ together** vintlə bir yerə bağlamaq; **to ~ two pieces of wood together** iki taxta parçasını vintlə bir-birinə bərkitmək;

◊ **to have *one's* head ~ed on the right way** ≅ ağlı başında/üstündə olmaq

**screw-bolt** [ˈskru:boult] *n* bolt

**screw-cutter** [ˈskru:ˌkʌtəʳ] *n* vintaçan/yivaçan dəzgah

**screw-thread** [ˈskru:θred] *n* yiv

**screwdriver** [ˈskru:draıvəʳ] *n* vintaçan, vintburan

**scribble**[1] [ˈskrıbl] *n* səliqəsiz/oxunması çətin olan xətt; cızma-qara; *I can't read this scribble Mən bu cızma-qaranı oxuya bilmirəm*

**scribble**[2] [ˈskrıbl] *v* 1. səliqəsiz/tələsik yazmaq; **to ~ a few lines** tələsik bir neçə sətir yazmaq; **to ~ *one's* name on *smth*.** bir şeyin üstünə adını tələsik yazmaq/qol çəkmək; 2. cızma-qara etmək, kağızı korlamaq *(boş, mənasız şeylər*



*yazmaqla)*; **to ~ silly novels** *d.d.* boş/mənasız romanlar yazmaq

**scribbler** [ˈskrıbləʳ] *n* I *d.d.* cızma-qaraçı *(dəyərsiz şeylər yazan mühərrir, yazıçı)*

**scribbler** [ˈskrıbləʳ] *n* II *toxuc.* yundidən maşın, yun didmək üçün maşın

**scribe** [skraıb] *n* 1. mirzə; 2. *amer.* yazıçı

**scrimmage**[1] [ˈskrımıdʒ] *n* 1. dava-dalaş, vurhavur, qarışıqlıq; həngamə; qızğın mübahisə; 2. top üstündə toqquşma/vuruşma *(futbol, reqbi oyununda)*; 3. *hərb.* əlbəyaxa vuruşma /döyüşmə

**scrimmage**[2] [ˈskrımıdʒ] *v* 1. dava-dalaşda iştirak etmək; 2. topun ətrafına toplaşmaq *(futbol, reqbi oyununda)*

**script**[1] [skrıpt] *n* 1. ssenari; **to make a ~ of a story** hekayə üzrə ssenari yazmaq; 2. əlyazma-sı, əlyazısı; **a neat ~** səliqəli əlyazması/əlyazısı; 3. əlifba; şrift; **document in Cyrillic ~** Kirill əlifbasında/şrifti ilə yazılmış sənəd; 4. imtahan verənin yazı işi

**script**[2] [skrıpt] *v* ssenari yazmaq *(kino, radio və ya televiziya üçün)*

**scriptural** [ˈskrıptʃərəl] *adj* Bibliya, Bibliyaya aid olan; **~ references** Bibliya məlumatları; **~ knowledge** Bibliyaya aid bilik

**scripture** [ˈskrıptʃəʳ] *n* 1. *(adət.* **the Scriptures***)* Bibliya *(Tövrat və İncil)*; **to read the ~** Bibliyanı oxumaq; 2. müqəddəs kitab

**scriptwriter** [ˈskrıptˌraıtəʳ] *n* ssenarist, ssenariçi, ssenari yazan

**scroll**[1] [skroul] *n* 1. lülə halında bükülmüş kağız və s., manuskript *(qədim əl yazısı)*; 2. buruq, burum, quyruq *(imzada, hərfdə)*

**scroll**[2] [skroul] *v* 1. eşilmək, bürmələnmək, burulmaq, qıvrılmaq; 2. qıvrım yazmaq; 3. kompyüter ekranında mətni aşağı-yuxarı aparmaq

**scrotum** [ˈskroutəm] *n (pl* **scrotums** *və ya* **scrota***)* *anat.* xayalıq, xaya torbası

**scrub**[1] [skrʌb] *n* I 1. kolluq, kol, kol-kos; *The bird disappeared into the scrub Quş kolluqda gözdən itdi*; 2. kol-kos basmış yer

**scrub** [skrʌb] *n* II 1. təmizləmə; yuma *(adət. sabunla, şotka ilə)*; **to give *smth*. a good ~** bir şeyi yaxşı-yaxşı yumaq; *The floor needs a good scrub Döşəməni yaxşı-yaxşı yumaq lazımdır*; 2. cod şotka; 3. ağır və çirkli işlər görən, günəmuzd işləyən; 4. yabı

**scrub**[2] [skrʌb] *v* (-bb-) 1. təmizləmək, yumaq, qaşımaq, sürtüb/qaşıyıb təmizləmək *(adət. şotka və sabunla)*; **to ~ *one's* nails** dırnaqlarını təmizləmək *(şotka ilə)*; **to ~ the floor** döşəməni əsaslı surətdə/diqqətlə yumaq; 2. silmək; **to ~ oneself with a towel** özünü dəsmalla silmək, dəsmalla silinmək; 3. çirkli işlər görmək, süpürgəçi işləmək

**scrubby** [ˈskrʌbı] *adj* 1. alçaqboylu, balacaboylu, qısaboylu, kiçik, çox xırda *(adam, bitki, heyvan haq.)*; **~ trees** çox xırda/qısaboylu ağaclar; 2. *d.d.* düşkün, yoxsullaşmış; cüzi, çox az/kiçik; 3. kol-kos, xırda ağaclar basmış; **~ land** kol-kos basmış yer

**scrubwoman** [ˈskrʌbˌwumən] *n (pl* **-women** [-ˌwımın]*)* *amer.* süpürgəçi qadın/qız, günəmuzd fəhlə qadın/qız

**scruff** [skrʌf] *n* I peysər; **to take/to seize/to hold *smb*. by the ~ of the neck** bir kəsin yaxasından yapışmaq/tutmaq

**scruff** [skrʌf] *n* II pinti/səliqəsiz adam

**scruffily** [ˈskrʌfılı] *adv* səliqəsiz/pinti bir tərzdə

**scruffiness** [ˈskrʌfınıs] *n* pintilik, səliqəsizlik

**scruffy** [ˈskrʌfı] *adj* (-ier, -iest) pinti; səliqəsiz; **a ~ little town** səliqəsiz kiçik şəhər; *The hotel looked rather scruffy, so we decided not to stay there Mehmanxana çox səliqəsiz göründü və biz orada qalmamağı qərara aldıq*

**scrumptious** [ˈskrʌmpʃəs] *adj* 1. *d.d.* çox gözəl /əla *(xüs. yemək haq.)*; 2. gözəl, yaraşıqlı, qəşəng; **a ~ girl** qəşəng/gözəl qız, nazənin

**scrunch**[1] [skrʌntʃ] *n* xışıltı, xışıltı səsi; **the ~ of her shoes on the gravel** onun ayaqqabılarının çınqıl üzərində xışıltısı

**scrunch**[2] [skrʌntʃ] *v* 1. xışıldamaq, xırçıldamaq; 2. **(up)** əzişdirmək, əzmək, əzib yumrulamaq; *She took out the remaining chocolate and scrunched up the box O, şokoladın qalan hissəsini götürdü və qutunu əzişdirib yumruladı; Tom scrunched his letter into a ball Tom məktubunu əzişdirib top kimi yumruladı*; 3. yığmaq, kiçiltmək; **to ~ up *one's* shoulders** çiyinlərini yığmaq

**scruple**[1] [ˈskru:pl] *n* 1. şübhə, tərəddüd; qərarsızlıq; **to make/to have no ~ about/of doing *smth*., to do *smth*. without ~** bir şeyi etməkdə qərarsızlıq/tərəddüd göstərməmək; 2. *adət. pl* vicdan əzabı *(həm də* **~ of conscience***)*; **a man without/of no ~s** vicdansız adam; **to have ~s about doing *smth*.** bir şeyi etməyə utanmaq/xəcalət çəkmək; **to put an end to *smb.'s* ~s** bir kəsin vicdanını sakitləşdirmək

**scruple**[2] [ˈskru:pl] *v* 1. *(adət. inkar cümlələrdə)* tərəddüd/şübhə etmək, qərarsızlıq göstərmək; utanmaq, çəkinmək; *Don't scruple to ask for anything you want Sənə/Sizə lazım olan şeyi istəməkdən utanma/ utanmayın*; 2. vicdan əzabı çəkmək; *He scrupled to do/doing it Bunu etməyə vicdanı ona yol vermədi*; 3. *arx.* şübhələnmək, inanmamaq

**scrupulous** [ˈskru:pjuləs] *adj* 1. düz, təmiz, vicdanlı, namuslu, sədaqətli, səmimi; *He is not too scrupulous O çox da vicdanlı/səmimi deyil*; **to be ~ about/over *smth*.** bir şey haqqında vicdanlı/sədaqətli/səmimi olmaq; bir şeyə vicdanla/namusla yanaşmaq; 2. qüsursuz, nöqsansız, eyibsiz, təmiz; **~ honesty** təmiz vicdan; **~ neatness** ideal təmizlik; 3. ehtiyatlı; vasvası, xırda-

çı; **to act with ~ honesty** bir şeyi son dərəcə ehtiyatla etmək; **to be ~ in all business relations** bütün işlərdə çox/son dərəcə ehtiyatlı olmaq; 4. diqqətli, səliqəli; mükəmməl, əsaslı, incədən-incəyə; **with ~ care** son dərəcə böyük diqqətlə; **a ~ adherence to the truth** həqiqətə tam/mükəmməl riayət etmək; **to be most ~ in *one's* dress** geyiminə çox diqqət yetirmək, geyimində çox diqqətli olmaq

**scrupulously** ['skru:pjuləslı] *adv* 1. namusla, vicdanla; düz, doğru, insafla; **to attend ~ to a duty** borcunu namusla/vicdanla yerinə yetirmək; 2. nöqsansız, eyibsiz, qüsursuz olaraq, tam, təmiz; **to observe *smth.*** ~ bir şeyə tam/tamamilə əməl etmək

**scrupulousness** ['skru:pjuləsnıs] *n* 1. düzlük, təmizlik, doğruluq; namus, vicdan, səmimilik, səmimiyyət; 2. eyibsizlik, nöqsansızlıq, qüsursuzluq, təmizlik; 3. xırdaçılıq, vasvasılıq; həddən artıq prinsipiallıq; 4. dəqiqlik, dürüstlük, doğruluq, düzgünlük; pedantlıq

**scrutinize, -ise** ['skru:tınaız] *v* 1. diqqətlə baxmaq/gözdən keçirmək; **to ~ *smb.'s* face** bir kəsin üzünə diqqətlə baxmaq; 2. əsaslı surətdə öyrənmək; **to ~ a proposal/a plan** təklifi/planı əsaslı surətdə öyrənmək; 3. sənədləri diqqətlə yoxlamaq *(xüs. seçkilərdə)*; **to ~ an electoral list** seçicilərin siyahısını diqqətlə yoxlamaq; **to ~ a document** sənədi əsaslı surətdə yoxlamaq

**scrutiny** ['skru:tını] *n* 1. diqqətlə öyrənmə; **a ~ of the morning papers** səhər qəzetlərini diqqətlə nəzərdən keçirmək; 2. əsaslı surətdə/ətraflı tədqiq etmə; **a ~ of the proposal/of the plan** təklifin/planın əsaslı surətdə tədqiq edilməsi; 3. seçki bülletenlərinin sayılmasının doğruluğunu yoxlama

**scud** [skʌd] *v* (-dd-) bərk getmək, sürətlə və rəvan hərəkət etmək, bərk qaçmaq; *The clouds scudded across the sky Buludlar göyün üzündə sürətlə hərəkət edirdi*

**scuff** [skʌf] *n* 1. ayaqlarını sürüyərək yerimək, ayaqları ilə sürtmək; 2. ayaqları ilə silmək; 3. sürtülmək, köhnəlmək, yırtılmaq, çox işlənib xarab olmaq / yeyilmək; 4. yüngülcə toxunmaq /sürtünmək; **to ~ up** ayağı ilə qaldırmaq *(toz, qar və s.)*; **to ~ up the dust** ayağı ilə toz qaldırmaq

**scuffle**[1] [skʌfl] *n* dava, vuruşma, savaşma, dalaşma, dava-dalaş, dava-qalmaqal; **to be involved in a ~** dava-dalaşda iştirak etmək, dava-dalaşa cəlb olunmaq; *Scuffles broke out between police and demonstrators Polislə nümayişçilər arasında dava/dava-dalaş başladı*

**scuffle**[2] [skʌfl] *v* I 1. dalaşmaq, savaşmaq; dava-da/dava-dalaşda iştirak etmək; **to ~ with *smb.*** bir kəslə dalaşmaq/savaşmaq; 2. tələsik/əlüstü /atüstü etmək *(bir şeyi)*; **to ~ through a task** tapşırığı tələsik yerinə yetirmək; 3. ayağını sürüyə-sürüyə yerimək

**scuffle** [skʌfl] *v* II toxalamaq, torpağı boşaltmaq

**scull**[1] [skʌl] *n* avar, kürək; avar çəkmə

**scull**[2] [skʌl] *v* iki kürəklə avar çəkmək

**sculler** ['skʌlə<sup></sup>] *n* iki kürəklə avar çəkən *(adam)*

**scullery** ['skʌlərı] *n* mətbəxin yanında qab yuyulan yer *(balaca otaq, xüs. böyük evlərdə)*

**scullery maid** ['skʌlərımeıd] *n* qabyuyan

**sculptor** ['skʌlptə] *n* heykəltəraş

**sculptress** ['skʌlptrıs] *n* heykəltəraş qadın/qız

**sculptural** ['skʌlptʃərl] *adj* heykəltəraşlıq; **the ~ arts** heykəltəraşlıq sənəti

**sculpture**[1] ['skʌlptʃə] *n* 1. heykəltəraşlıq; 2. heykəltəraşlıq əsəri; heykəllər; **ancient ~s** qədim heykəltəraşlıq əsərləri/heykəllər; **a work of ~** heykəltəraşlıq əsəri; 3. yer qabığının qatları

**sculpture**[2] ['skʌlptʃə] *v* 1. heykəl düzəltmək/ qayırmaq/ yonmaq *(ağacdan, daşdan, mərmərdən və s.)*; **to ~ a head in stone** daşdan baş yonmaq; **to ~ a statue out of hard wood** bərk ağacdan heykəl düzəltmək/ yonmaq/ yapmaq; 2. heykəllərlə bəzəmək; 3. dağıtmaq *(adət. yer qabığını)*

**scum**[1] [skʌm] *n* 1. kəf; köpük; **to take the ~ off the pot** qazanın kəfini almaq; 2. çirkab, nəcis, murdarlıq; tullantı, tör-töküntü; 3. *top.i* hörmətdən düşmüş/bədnam olmuş adamlar; **the ~ of society/of the earth** cəmiyyətin tör-töküntüləri/pozğun ünsürləri; 4. alçaq, əclaf, yaramaz *(adam)*

**scum**[2] [skʌm] *v* 1. kəfi/köpüyü almaq; 2. köpüklənmək; köpüklə/kəflə örtülmək

**scummy** ['skʌmı] *adj* 1. köpüklü, köpüklənən, köpüklə örtülmüş/örtülü; **cold, ~ tea** soyumuş köpüklü çay; 2. *d.d.* alçaq, rəzil, yaramaz

**scurf**[1] [skə:f] *n* 1. kəpək *(başda)*; 2. ərp; irinlik; 3. köpük, kəf

**scurf**[2] [skə:f] *v* kəfi/köpüyü almaq, ərpi təmizləmək

**scurfy** ['skə:fı] *adj* 1. kəpəkli, kəpək basmış *(baş, saç haq.)*; 2. ərp bağlamış, ərplə örtülmüş

**scurrility** [skʌ'rılıtı] *n* 1. kobudluq, qabalıq; sərtlik; ədəbsizlik, həyasızlıq; kobud söyüş; 2. ağyalan; 3. kobud/təhqiredici irad; 4. kobud təlxəklik/oyunbazlıq

**scurrilous** ['skʌrıləs] *adj* 1. kobud, qaba; ədəbsiz, nəzakətsiz; həyasız; nalayiq, yaramaz; təhqiredici, həqarətli; alçaldıcı, toxunan; **a ~ song** nalayiq/ədəbsiz mahnı; **a ~ story** nalayiq/alçaldıcı əhvalat; **to make a ~ attack on *smb.*** bir kəsə qarşı kobud/ədəbsiz söyüş yağdırmaq; **~ accustation** təhqiredici ittiham; 2. yalançı

**scurrilously** ['skʌrıləslı] *adv* kobud, qaba, nalayiq; həyasızcasına, təhqiredici/alçaldıcı bir tərzdə

**scurry**[1] ['skʌrı] *n* 1. sürətli hərəkət; **regular ~** təşviş içərisində ümumi qaçış; 2. küləkli leysan, küləklə yağan qar

**scurry**[2] ['skʌrı] *v* (*pt, pp* **scurried**) 1. tələsik hərəkət etmək, qaçmaq *(adət. kiçik addımlarla)*, səkmək; *The children scurried home from school Uşaqlar dəstə halında məktəbdən evə qaçdılar; The mice scurried back to their holes Siçanlar cəld geri yuvalarına qaçdılar*; 2. tələş içərisində/tələsə-tələsə hərəkət etmək; **to hurry and ~ about the room** tələş içərisində otaqda o yan bu yana qaçmaq; 3. *d.d.* tələsmək, tələsik etmək *(bir şeyi)*; **to ~ through *one's* work** işini tələsik qurtarmaq; **to ~ away** qaçıb getmək/gizlənmək, yox olmaq, gözdən itmək



**scurvy**[1] ['skə:vı] *n tib.* sinqa, skorbut *(vitaminsizlik nəticəsində diş ətində əmələ gələn xəstəlik)*

**scurvy**[2] ['skə:vı] *adj* 1. alçaq, əclaf, rəzil; mənfur, nifrətəlayiq; **~ action** alçaq/nifrətəlayiq hərəkət; **a ~ trick** mənfur/ nifrətəlayiq zarafat; 2. tərbiyəsiz; **a ~ fellow** tərbiyəsiz oğlan

**scut** [skʌt] *n* 1. gödək dikduran quyruq *(dovşanda, maralda və s.)*; 2. yaramaz, alçaq, nifrətəlayiq adam; 3. dovşan

**scythe**[1] [saıð] *n k.t.* kərənti, dəryaz

**scythe**[2] [saıð] *v k.t.* çalmaq, biçmək *(kərənti ilə)*

**scytheman** ['saıðmən] *n* (*pl* **-men** [-mən]) otçalan, kərəntiçi

**sea**[1] [si:] *n* 1. Yer kürəsinin su ilə örtülmüş səthi; *The sea covers nearly three-fourths of the world's surface Yer səthinin təxminən dörddə üç hissəsini su örtür*; 2. dəniz; **closed ~** örtülü dəniz *(yəni bir ölkənin ixtiyarında olan)*; **the Black ~** Qara dəniz; **the Caspian ~** Xəzər dənizi; **at ~** dənizdə; **at the bottom of the ~** dənizin dibində; **by ~** dəniz yolu ilə; **on land and on ~** quruda və dənizdə; *Baki is on the Caspian sea Bakı Xəzər dənizi sahilindədir*; **a town on the ~** dənizkənarı şəhər; **at ~, on the high ~s** açıq dənizdə; **to jump into the ~** dənizə tullanmaq; 3. dəniz səthi; *The sea is like a looking-glass Dənizin səthi güzgüyə oxşayır; The sea was calm/ stormy Dəniz sakit/tufanlı idi*; 4. çoxlu, külli miqdar; **~s of blood** çoxlu qan; **a ~ of troubles** çoxlu əziyyət; **waving ~s of people** əllərini yelləyən insan dənizi;

◊ **the four ~s** Böyük Britaniya sahillərini yuyan dörd dəniz; **mistress of the ~(s)** dəniz hökmranı, ən qüvvətli dəniz dövləti; **to go to ~** dənizçi olmaq

**sea**[2] [si:] *adj* dəniz; **~ air** dəniz havası; **a ~ battle** dəniz vuruş/döyüşü; **a ~ bird** dəniz quşu; **~ breeze** dəniz mehi; **a ~ chart** dəniz xəritəsi; **~ forces** hərbi-dəniz qüvvələri; **a ~ horse** dəniz atı *(balıq növü)*; **a ~ level** dəniz səviyyəsi; **a ~ power** dəniz dövləti; **a ~ trip** dəniz səyahəti; **a ~ war** dəniz müharibəsi; **~ water** dəniz suyu

**seabed** ['si:bed] *n* dəniz yatağı

**seaboard** ['si:bɔ:d] *n* dəniz kənarı, sahil boyu; **on the ~** dəniz kənarında

**seaborne** ['si:bɔ:n] *adj* dənizlə daşınan; **~ trade** dəniz ticarəti

**sea-eagle** ['si:'i:gl] *n zool.* dəniz qartalı

**sea-fight** ['si:faıt] *n* dəniz vuruşması/döyüşü

**sea-fish** ['si:fıʃ] *n* dəniz balığı

**sea-foam** ['si:'foum] *n* dəniz köpüyü

**sea-food** ['si:'fu:d] *n amer.* dəniz ərzağı *(yeməli mollyusklar, krab və s.)*

**sea-fowl** ['si:faul] *n* dəniz quşu

**sea-god** ['si:'gɔd] *n* dəniz allahı

**sea-goddess** ['si:'gɔdıs] *n* dəniz ilahəsi

**sea-grass** ['si:'gra:s] *n* dənizotu

**sea-gull** ['si:'gʌl] *n zool.* qağayı

**seal**[1] [si:l] *n* I 1. *zool.* suiti; 2. suiti dərisi

**seal** [si:l] *n* II 1. möhür; **customs ~** gömrük möhürü; **to affix/to put *one's* ~ to a document** sənədi möhürləmək, sənədə möhür vurmaq; **to attest by a ~** möhürlə təsdiq etmək; **to break the ~ of a letter** məktubun möhürünü cırmaq; 2. damğa; **to impress a ~ upon *smth.*** bir şeyin üstünə damğa vurmaq; 3. plomb *(malın üstündən asılan qurğuşun damğa)*; **customs ~** gömrük plombu; **to remove the ~s** plombları götürmək; 4. iz, yer, nişanə, əlamət; *Death had already set its seal on his face Onun üzündə artıq ölüm izi/əlaməti görünürdü*; 5. işarə; sübut; **the ~ of approval** razılıq işarəsi; **the ~ of his acceptance** onun razılığının işarəsi/sübutu; **to set the/*one's* ~ upon/to *smth.*** bir şeyi rəsmi olaraq təsdiq etmək; 6. təntənəli vəd; öhdəlik; əhd-peyman; **a kiss as the ~ of his love** onun əhd-peyman öpüşü; 7. *(adət.* **the ~s***)* hakimiyyət; ixtiyar, vəkalət; **to return the ~** istefaya çıxmaq/getmək, hakimiyyəti təhvil vermək;

◊ **the Great/the Privy Seal** Böyük Britaniyanın dövlət möhürü

**seal**[2] [si:l] *v* 1. möhürləmək, möhür vurmaq; **to ~ a document** sənədi möhürləmək, sənədə möhür vurmaq; *The treaty has been signed and sealed Müqaviləyə qol çəkilib və möhür vurulub*; 2. damğalamaq, damğa vurmaq/basmaq *(adət. ölçüyə, tərəziyə)*; 3. plomb vurmaq; *Officials have sealed (up) all doors Hökumət nümayəndələri bütün qapılara plomb vurublar*; 4. bağlamaq *(zərfi və s.) (həm də* **to ~ up***)*; **to ~ (up) an envelope/a bottle** zərfi/butulkanı bağlamaq; **to ~ up a tin of food/a pipe** ərzaq qutusunu/borunu bağlamaq; *The windows must be sealed up Pəncərələr möhkəm bağlanmalıdır*; 5. *hərb.* mühasirəyə almaq *(həm də* **to ~ off***)*; *The army immediately sealed the country's border Ordu dərhal ölkənin sərhədlərini mühasirəyə aldı*; 6. iz qoymaq/buraxmaq; *Death has sealed her for his own Ölüm onun üzündə öz izini buraxıb*; 7. qəti olaraq həll/təsdiq etmək; **to ~ an agreement** müqaviləni/ razılaşmanı təsdiq etmək;

◊ **to ~ *smb.'s* fate** bir kəsin taleyini uğursuz həll etmək; *The airman's carelessness sealed his fate Təyyarəçinin diqqətsizliyi onun taleyini həll etdi*

**sealed** [si:ld] *adj* 1. möhürlənmiş, möhür vurulmuş/basılmış; ~ **ballot boxes** möhürlənmiş seçki qutuları; **a ~ envelope** möhürlənmiş zərf; 2. germetik, kip; **a ~ cabin** germetik kabinə
**sea-line** ['si:laın] *n* sahil xətti
**sealing-wax** ['si:lıŋwæks] *n* surğuc
**seam**[1] [si:m] *n* 1. tikiş, tikiş yeri; **the ~ of a garment** paltarın tikişi/tikiş yeri; **the ~s down the sides of his trousers** onun şalvarının yanlarından aşağı gedən tikişlər/tikiş yerləri; 2. *tex.* qaynaq/bənd yeri; **welded ~** qaynaq edilmiş yer/bənd; 3. yara yeri, çapıq *(dəridə)*; **~ of an old wound** köhnə yaranın yeri; 4. dərin qırışıq/qırış; 5. *k.t.* şırım *(kotanın yerdə açdığı)*
**seam**[2] [si:m] *v* 1. **(together)** bir yerə tikmək; **to ~ two pieces of cloth together** iki qırıq parçanı bir-birinə tikmək; 2. dərin/unudulmaz iz buraxmaq; *Her face is seamed with sorrow Kədər onun sifətində dərin iz buraxıb*; 3. *k.t.* şırımlamaq, şırım açmaq
**seamed** [si:md] *adj* 1. yarıqla/çapıqla örtülmüş; **~ with cracks** yarıqla örtülmüş; **a face ~ with scars** çapıqla örtülmüş/çoxlu çapığı olan sifət; 2. qırışmış; **hands ~ with wrinkles** qırışmış əllər, qırışlı əllər
**sea-maid** ['si:meıd] *n* = **sea-maiden**
**sea-maiden** ['si:,meıdn] *n* = dəniz ilahəsi; su pərisi
**seaman** ['si:mən] *n* (*pl* **-men** [-mən]) 1.dənizçi; dəniz səyyahı; gəmiçi; **good/poor ~** yaxşı/pis dənizçi; *The Romans at that time were no seamen Romalılar o vaxt pis dəniz səyyahı/dənizçi idilər*; 2. matros *(gəmi işçisi; hərbi dəniz donanmasının əsgəri)*; **an ordinary ~** adi matros
**seamanlike** ['si:mənlaık] *adj* yaxşı/təcrübəli dənizçi kimi
**seamanship** ['si:mənʃıp] *n* 1. dənizçilik məharəti/ustalığı/ bacarığı; 2. dənizçi sənəti/peşəsi
**sea-mile** ['si:maıl] *n* dəniz mili *(uzunluq ölçüsü)*
**seaminess** ['si:mınıs] *n* 1. tikişlilik; çapıqlılıq; 2. xoşagəlməzlik, xoşagetməzlik, yaramazlıq
**seamless** ['si:mlıs] *adj* 1. tikişsiz, bir hissədən ibarət; 2. qaynaqsız/bəndsiz *(boru haq.)*
**seamster** ['si:mstəʳ] *n arx.* dərzi/tikişçi qadın
**seamy** ['si:mı] *adj* (**-ier, -iest**) 1. tikişli, tikişlə örtülü; qırış, qırışla örtülü; 2. xoşagəlməz, pis, yaramaz; **the ~ side of human nature** insan təbiətinin xoşagəlməz/yaramaz tərəfi
**seaplane** ['si:pleın] *n* hidroplan *(sudan qalxa bilən təyyarə)*
**seaport** ['si:pɔ:t] *n* dəniz limanı
**sear**[1] [sıəʳ] *adj şair.* quru, qurumuş, solğun, solmuş;
◊ **the ~ and yellow leaf** ***(Shakespeare)*** 1) payız, xəzan; 2) qocalıq
**sear**[2] [sıəʳ] *v* 1. qurumaq, solmaq; qurutmaq, soldurmaq *(bitkini)*; 2. yandırmaq, dağlamaq; **to ~ a wound with a hot iron** yaranı isti dəmirlə dağlamaq; 3. yanmaq, dağlanmaq; *Her heart seared with anger Onun qəlbi/ürəyi qəzəbdən yandı/dağlandı*; 4. *məc.* amansızlaşdırmaq, sərtləşdirmək; mərhəmətsiz etmək; qəzəbləndirmək; *His soul has been seared by injustice Ədalətsizlik onun qəlbini amansızlaşdırıb/qəzəbləndirib/qəddarlaşdırıb*
**search**[1] [sə:tʃ] *n* 1. axtarış; axtarma; **a ~ for a missing aircraft** itmiş təyyarənin axtarışı; **a long ~ for the lost child** itmiş uşağın uzun müddət axtarılması; **the ~ for/after truth** həqiqət axtarma; **to make a ~ for *smb./smth.*** bir kəsi/şeyi axtarmaq; **to set out in ~ of *smth.*** bir şeyi axtarmağa başlamaq; 2. axtarış; **right of ~** axtarış hüququ; 3. *amer.* yoxlama, araşdırma, təhqiq etmə; baxma
**search**[2] [sə:tʃ] *v* 1. axtarmaq; **to ~ for a book /for a lost ring/for a manuscript** kitabı/itmiş üzüyü/əlyazmasını axtarmaq; **to ~ after happiness** xoşbəxtlik axtarmaq; *We searched for hours but couldn't find the book Biz saatlarla axtardıq, lakin kitabı tapa bilmədik;* 2. hər tərəfi/hər yeri axtarmaq; **to ~ the city for the thief** oğrunu tapmaq üçün şəhərin hər yerini axtarmaq; **to ~ a house** evin hər yerini axtarmaq, evdə axtarış aparmaq; 3. diqqətlə nəzərdən keçirmək; **to ~ *smb.'s* face** bir kəsin üzünə diqqətlə baxmaq; 4. tapmaq, axtarıb tapmaq; **to ~ through the dictionary for a word** lüğətdə söz axtarmaq; 5. tədqiq etmək, araşdırmaq; **to ~ into the cause of *smth.*** bir şeyin səbəbini araşdırmaq; **to ~ out** tapmaq, axtarıb tapmaq; **to ~ out an old friend** köhnə dostu axtarıb tapmaq
**searcher** ['sə:tʃəʳ] *n* axtarış aparan, tədqiqatçı
**searching** ['sə:tʃıŋ] *adj* 1. diqqətli, mükəmməl, əsaslı, dəqiq; dərin; **~ examination/study** diqqətli/əsaslı öyrənmə; **~ inquiry** dəqiq araşdırma/istintaq; 2. diqqətlə göz yetirən, zənn ilə baxan; **to give *smb.* a ~ look** bir kəsə zənn ilə baxmaq/diqqətlə göz yetirmək; 3. kəskin, iliyə işləyən, çox şiddətli/güclü; **~ smell** kəskin iy; **~ wind** çox şiddətli/çox güclü külək
**searchlight** ['sə:tʃlaıt] *n* projektor
**seascape** ['si:skeıp] *n* 1. marina *(dəniz mənzərəsini təsvir edən şəkil)*; 2. gözəl dəniz mənzərəsi
**sea-shell** ['si:ʃel] *n* balıqqulağı
**seashore** ['si:ʃɔ:ʳ] *n (adət.* **the ~)** dəniz kənarı
**seasick** ['si:sık] *adj* qusan, ürəyi bulanan *(dənizdə səyahət edərkən)*; **to be/to get ~** ürəyi bulanmaq, qusmaq, qaytarmaq
**seasickness** ['si:sıknıs] *n* gəmi xəstəliyi, gəmi tutması, ürəkbulanması *(gəmidə gedərkən)*
**seaside**[1] ['si:saıd] *n (çox vaxt* **the ~)** 1. dəniz qırağı, dənizkənarı; **to live at the ~** dəniz qırağında/kənarında yaşamaq; 2. dəniz sahilindəki/dəniz sahilində olan kurort; **to go to the ~** dəniz sahilində olan kurorta getmək
**seaside**[2] ['si:saıd] *adj* dənizkənarı; **a ~ town** dənizkənarı şəhər; **a ~ hotel** dənizkənarı mehmanxana



**season**[1] ['si:zn] *n* 1. fəsil; **the ~s of the year** ilin fəsilləri; **the alternations of the ~s** fəsillərin növbələşməsi; **the four ~s** dörd fəsil; *There are four seasons in a year İldə dörd fəsil var; Winter is the coldest season of the year Qış ilin ən soyuq fəslidir*; 2. mövsüm; vaxt, müddət; **the football/baseball ~** futbol/beysbol mövsümü; **the holiday/tourist ~** istirahət/turizm mövsümü; **the blossoming ~** çiçəklənmə/çiçəkaçma mövsümü/vaxtı; **the strawberry ~** çiyələk yetişən vaxt, çiyələk mövsümü; **wet ~** yağmur mövsümü; **the rainy/the dry ~** yağmurlu/quraq mövsüm; **the ~ of harvest** məhsul yığımı/toplanması vaxtı; **to be out of ~** mövsümə uyğun olmayan; *Peaches are out of season now İndi şaftalı mövsümü deyil*; **a rest ~** istirahət vaxtı/mövsümü; **to stop work for a ~** bir müddət işi dayandırmaq; *This film will be shown for a short season Bu film qısa müddətdə nümayiş etdiriləcək/göstəriləcək; There is a season for work and for play İşin də, əyləncənin də öz vaxtı var*;
◊ **in ~** vaxtında, vaxtında olan; **a word in ~** vaxtında deyilmiş söz; **an advice in ~** vaxtında verilmiş məsləhət; **out of ~** vaxtsız, yersiz; **a remark out of ~** yersiz irad; **in ~ and out of ~** həmişə; yerli-yersiz, vaxtbivaxt
**season**[2] ['si:zn] *v* 1. istifadə üçün yararlı etmək; qurutmaq, bir müddət saxlamaq və s.; **to ~ timber** meşə materialını/taxta-şalbanı qurutmaq *(açıq havada)*; **to ~ wine** şərabı/çaxırı uzun müddət saxlayıb keyfiyyətini yaxşılaşdırmaq; 2. istifadə üçün yararlı hala düşmək *(qurumaq, yetişmək və s.)*; *Timber seasons best in summer Taxta-şalban ən yaxşı yayda quruyur;* 3. öyrətmək, alışdırmaq *(bir şeyə)*, bərkitmək, möhkəmlətmək və s.; **to ~ oneself to cold/to heat** özünü soyuğa/istiyə öyrətmək; **to ~ soldiers** əsgərləri hərbi xidmətə alışdırmaq; 4. xörəyə dad verən şey qatmaq *(məs. ağartı, ədviyyat və s.)*, dad vermək; **to ~ dishes** xörəyə ədva və s. qatmaq; **to ~ meat with salt** ətə duz qatmaq/vurmaq /tökmək; 5. *məc.* maraq artırmaq/ oyatmaq; canlandırmaq; **to ~ conversation with wit** hazırcavablıqla söhbəti canlandırmaq
**seasonable** ['si:znəbl] *adj* 1. ilin fəsillərinə müvafiq/uyğun; **~ weather** ilin fəslinə müvafiq/uyğun hava; 2. münasib, vaxtında; vaxtında olan; **~ gift** münasib hədiyyə; **~ aid/help** vaxtında göstərilən kömək; *The help came at a most seasonable time Kömək lap lazım olan vaxt gəldi*
**seasonably** ['si:znəblı] *adv* mövsümündə; vaxtında, zamanında
**seasonal** ['si:zənl] *adj* 1. mövsüm, mövsümi; **~ work/ prices** mövsümi iş/qiymətlər; **~ trade/ occupation** mövsümi ticarət/vəzifə; **~ changes of climate** iqlimin mövsümi dəyişməsi; 2. müvəqqəti; **a ~ employee** müvəqqəti əməkdaş; 3. vaxtaşırı, dövri; **the ~ migration of birds** quşların vaxtaşırı köçməsi/uçub getməsi
**seasoned** ['si:znd] *adj* 1. möhkəm, mətanətli, bişmiş, sınaqdan çıxmış; **a ~ traveller** mətanətli/sınaqdan çıxmış səyyah; 2. şirə qatılmış, ədviyyat vurulmuş *(xörək haq.)*; **highly ~ dishes** tünd/kəskin xörəklər
**seasoning** ['si:znıŋ] *n* 1. şirə, ədviyyat, xuruş; *Salt and pepper are the two most common seasonings in cooking Duz və istiot aşpazlıqda ən çox işlənən ədviyyatlardır*; 2. təbii qurutma; uzun müddət saxlama *(şərabı, pendiri və s.)*
**seat**[1] [si:t] *n* 1. yer; **a driver's ~** sürücünün yeri; **a car with four ~s** dördyerli maşın; **to take a ~** oturmaq; *Please, take a seat Zəhmət olmasa, otur/oturun*; **to take *one's* ~** yerində oturmaq; **to keep *one's* ~** yerində qalxmamaq; **to rise from *one's* ~** yerindən qalxmaq; 2. oturacaq; **a stone ~ in the garden** bağda daş oturacaq; **a chair with a leather ~** dəri oturacaqlı stul; **the ~ of a chair/of a bicycle** stulun/velosipedin oturacağı; **to use a box as a ~** qutudan oturacaq kimi istifadə etmək; 3. dal, dal/arxa tərəf; **the ~ of *smb.'s* trousers** bir kəsin şalvarının dalı/dal tərəfi; 4. olduğu yer; *London is the seat of government London hökumətin oturduğu yerdir*; 5. yer *(teatrda və s.)*, bilet; **a ~ at the theatre/in the train** teatrda/qatarda yer; **to book a ~** bilet almaq *(teatra)*; 6. parlamentdə yer; **a ~ in the House of Commons** İcmalar Palatasında yer; **to have a ~ in Parliament** Parlament üzvü olmaq; **to hold a ~** Parlamentdə yerini saxlamaq; Parlament seçkilərində qalib gəlmək; **to lose *one's* ~** parlament seçkilərində uduzmaq, parlamentə seçilməmək; 7. vəzifə; **a ~ on the bench** hakim vəzifəsi; 8. malikanə, mülk; **an old family ~** köhnə ailə malikanəsi/mülkü; 9. oturuş qaydası *(at üstündə)*; **to have a good/a poor ~** at üstündə yaxşı/pis oturmaq
**seat**[2] [si:t] *v* 1. oturtmaq, otuzdurmaq, əyləşdirmək; **to ~ *smb.* in an arm-chair** bir kəsi kreslodа oturtmaq/ əyləşdirmək; **to ~ *smb.* to the right of the hostess** bir kəsi ev sahibinin sağında otuzdurmaq; 2. oturmaq; **to be ~ed** oturmaq; *He can't remain seated a minute O, bir dəqiqə yerində otura bilmir*; **to ask/to beg *smb.* to be ~ed** bir kəsdən oturmağı xahiş etmək; *Please be seated Xahiş edirəm, əyləş/əyləşin*; 3. tutmaq; *The theatre/The hall will seat 500 Teatr /Zal 500 adam tutur; How many people can you seat in this room? Bu otaq neçə adam tuta bilər?*; 4. yeni oturacaq qoymaq; **to ~ a chair** stula yeni oturacaq qoymaq; 5. yerləşmək; *Their house seated in a pretty garden Onların evi qəşəng bir bağda yerləşir*
**seat-belt** *(həm də* **safety-belt)** ['si:tbelt] *n* təhlükəsizlik kəməri *(təyyarədə, maşında)*;

*Fasten your seat-belts Təhlükəsizlik kəmərini bağla/bağlayın*
**seating** ['si:tɪŋ] *n* 1. oturacaq, yer; ~ **for a hundred people** yüz adam üçün yer/oturacaq; 2. oturma, yerləşmə; *The seat of the audience took a long time Tamaşaçıların oturması/yerləşməsi xeyli vaxt aldı/apardı*
**seaward** ['si:wəd] *adv* dənizə tərəf; **to look ~** dənizə tərəf baxmaq
**seawards** ['si:wədz] *adv* = **seaward**
**seaway** ['si:weɪ] *n* farvater *(dənizdə gəmi keçə bilən yer)*
**seaweed** ['si:wi:d] *n* dəniz yosunu
**seawind** ['si:wɪnd] *n* dəniz mehi/küləyi
**sec** [sek] *n* I **second** *sözünün qısa forması; I'll be with you in a sec Mən bir saniyədən sonra səninlə/sizinlə olacam*
**sec** [sek] *n* II **secretary** *sözünün qısa forması*
**secateurs** [,sekə'tə:z] *n* bağ/bağban qayçısı
**secede** [sɪ'si:d] *v* çıxmaq *(partiyadan, ittifaqdan)*; **to ~ from military blocs** hərbi bloklardan çıxmaq
**secession** [sɪ'seʃn] *n* 1. çıxma *(partiyadan, ittifaqdan və s.)*; 2. ayrılma *(xüs. kilsədən)*; 3. *top.i* separatistlər; təfriqəçilər, təfriqə/nifaq/ayrılıq salanlar;
◊ **War of Secession** ABŞ-da vətəndaş müharibəsi *(1861-65-ci illər)*
**secessionist** [sɪ'seʃənɪst] *n* separatist *(separatizm/ayrılma tərəfdarı)*; təfriqəçi
**seclude** [sɪ'klu:d] *v* 1. ayırmaq, təcrid etmək; *The prisoners were carefully secluded from intercourse with each other Məhbuslar bir-biri ilə ünsiyyət saxlamamaq üçün ciddi təcrid edilmişdilər*; 2. **(to ~ oneself)** tənha bir yerə çəkilmək, adamlardan uzaqlaşmaq, xəlvətə çəkilmək; **to ~ oneself from society** cəmiyyətdən kənar yaşamaq, tənha həyat keçirmək, tənha yaşamaq
**secluded** [sɪ'klu:dɪd] *adj* 1. tək, tənha, yalqız, tək-tənha; xəlvət; ~ **life** tənha/yalqız həyat; **a ~ beach** xəlvət/tənha çimərlik; **to lead a ~ life** tənha/yalqız həyat sürmək; 2. uzaq, sakit, ucqar; a ~ **district** uzaq/ucqar rayon; **a ~ hamlet** ucqar kiçik kənd
**seclusion** [sɪ'klu:ʒn] *n* təklik, tənhalıq; **to live in ~** cəmiyyətdən uzaq/tənha yaşamaq; *She spoke to her father in the seclusion of his study O, atası ilə onun kabinetində təklikdə danışdı*
**second**[1] ['sekənd] *n* 1. saniyə *(vaxt ölçüsü)*; *60 seconds make one minute 60 saniyə bir dəqiqədir*; 2. dərəcə *(bucaq ölçüsü)*; **ten degrees fifteen ~s** on dərəcə 15 saniyə; 3. an, ləhzə, göz qırpımı; *Wait a second! Bir an gözlə/gözləyin!*; **to do smth. in a few ~s** bir şeyi bir anda/ləhzədə görmək; *I'll be ready in a second/in a few seconds Mən bir göz qırpımında/bir dəqiqədə hazır olacam; We mustn't lose a second Biz bir an itirməməliyik*
**second**[2] ['sekənd] *adj* 1. ikinci; ~ **proof** ikinci korrektura; **the ~ finger of the right hand** sağ əlin ikinci barmağı; **in the ~ place** ikincisi; 2. növbəti, o biri; **to go by the ~ train** növbəti qatarla getmək; ~ **cause** əlavə səbəb; 3. o biri; **a ~ pair of shoes** ayaqqabının o biri tayı; 4. əlavə; ehtiyat;
◊ **a ~ cousin** əminəvəsi, dayınəvəsi, xalanəvəsi, bibinəvəsi; **every ~ day** günaşırı
**second**[3] ['sekənd] *v* 1. müdafiə etmək *(təklifi, qətnaməni və s.)*; **to ~ a motion/a proposal** qətnaməni/təklifi müdafiə etmək; 2. sekundant olmaq *(dueldə)*; 3. kömək etmək, tərəfdar/şərik olmaq; **to ~ smb.'s efforts** bir kəsin səylərinə tərəfdar olmaq
**secondary** ['sekəndrɪ] *adj* 1. ikinci, ikinci dərəcəli; **a ~ stress** *dilç.* ikinci dərəcəli vurğu; 2. orta; ~ **education** orta təhsil; ~ **modern school** orta ümumtəhsil məktəb; ~ **teachers** orta məktəb müəllimləri; 3. əlavə; ~ **cause** əlavə səbəb; 4. köməkçi; ~ **armament** köməkçi artilleriya;
◊ ~ **bibliography** xüsusi sahə üzrə biblioqrafiya; ~ **ploughing** *k.t.* ikinci dəfə əkmə, ikiillik *(əkin)*
**second-best** ['sekənd'best] *adj* 1. ikinci növ; ~ **paper** ikinci növ kağız; 2. gündəlik, gündə geyilən; **a ~ dress** gündəlik paltar; **my ~ suit** mənim gündəlik geydiyim kostyumum
**second-hand** ['sekənd'hænd] *adj* 1. köhnə, köhnəlmiş, işlənmiş, nimdaş; **a ~ car** köhnə/köhnəlmiş/işlənmiş maşın; **a ~ book** köhnə kitab; **a ~ bookseller** bukinist *(köhnə və nadir kitab alıb-satan adam)*; **a ~ shop** komisyon mağazası *(mal götürüb satan mağaza)*; 2. alınmış, götürülmüş; iqtibas edilmiş; ~ **idea** alınmış/ iqtibas edilmiş fikir/ideya; 3. dolayısı ilə alınan/əldə edilən *(məlumat, xəbər və s.)*; 4. ikinci dərəcəli; **a ~ politician** ikinci dərəcəli siyasətçi
**secondly** ['sekəndlɪ] *adv* ikincisi; *Firstly, it's too expensive; and secondly, it's very ugly Birincisi, bu çox bahadır; ikincisi çox eybəcərdir/xoşagələn deyil*
**secrecy** ['si:krɪsɪ] *n* 1. gizlilik, məxfilik; sirr; ~ **of correspondence** yazışmanın məxfiliyi; **in/with ~** gizli, məxfi; **to do smth. with absolute ~** bir şeyi tamamilə gizli/məxfi etmək; *The meeting was held in great secrecy İclas çox gizli/məxfi təşkil edilmişdi*; 2. sirri saxlama bacarığı/qabiliyyəti; **to rely on smb.'s ~** bir kəsin sirr saxlama qabiliyyətinə arxayın olmaq
**secret**[1] ['si:krɪt] *n* sirr; məxfi/gizli/xəlvəti iş; **to keep a ~** sirr saxlamaq; **to entrust smb. with a ~** bir kəsə sirr vermək/sirrini etibar etmək; *We have no secrets from one another Bizim bir-birimizdən sirrimiz yoxdur, Biz bir-birimizdən heç bir sirr saxlamırıq*; **the ~ of his success** onun nailiyyətinin sirri; **the ~ of nature** təbiətin sirri; *What's the secret of his success? Onun



müvəffəqiyyətinin sirri nədir?/nədədir?*;
◊ **in ~** gizli, gizli olaraq, gizlicə, xəlvətcə, ələltdan; *I was told about it in secret Bu barədə mənə xəlvətcə/gizli olaraq danışdılar*; **to let smb. into a /the ~** bir kəsə sirr vermək/açmaq
**secret**[2] ['si:krɪt] *adj* 1. gizli, məxfi; **a ~ marriage/ document/ meeting/plan/agent** gizli kəbin/sənəd/iclas/plan/agent; ~ **talks** gizli/məxfi danışıqlar; **to keep *smth.* ~ from *one's* family** bir şeyi ailəsindən gizli saxlamaq; **to keep up a ~ correspondence with *smb.*** bir kəslə gizli yazışma aparmaq; *Secret talks where held between the government and the rebel leaders Dövlət və qiyamçı rəhbərlər arasında gizli danışıqlar aparıldı*; 2. gizlin, gizlədilmiş; **a ~ door/staircase** gizlin qapı/pillələn; 3. sirr verməyən, öz fikrini/niyyətini/rəyini gizli saxlayan;
◊ ~ **parts** cinsi orqanlar
**secretariat** [,sekrə'teərɪət] *n* 1. katiblik; **the UNO ~ in New York** BMT-nin Nyu Yorkdakı katibliyi; 2. katib vəzifəsi
**secretary** ['sekrətrɪ] *n* 1. katib; **private ~** şəxsi katib; **to act as ~ to *smb.*** bir kəsin katibi işləmək/olmaq; 2. katib, təşkilatın/idarənin və s. rəhbəri; ~ **general** baş katib; **first ~** birinci katib *(səfirlikdə)*; 3. nazir; **Foreign Secretary, Secretary for Foreign Affairs** Xarici İşlər Naziri *(İngiltərədə)*; **the Home Secretary, Secretary of State for Home Affairs** Daxili İşlər Naziri *(İngiltərədə)*
**secrete** [sɪ'kri:t] *v* 1. *fiziol.* ifraz etmək; 2. gizlətmək; **to ~ oneself** gizlənmək, özünü gizlətmək; **to ~ stolen goods** oğurlanmış malları gizlətmək
**secretion** [sɪ'kri:ʃn] *n* 1. ifraz etmə; 2. gizlətmə
**secretive** ['si:krətɪv] *adj* adamdanqaçan, adamayovuşmaz, qaradinməz
**secretiveness** ['si:krətɪvnɪs] *n* adamayovuşmazlıq, qaradinməzlik; utancaqlıq
**secretively** ['si:krətɪvlɪ] *adv* gizli, örtülü; **to negotiate ~ with *smb.*** bir kəslə gizli danışmaq /danışıq aparmaq; **to act ~** gizli/örtülü hərəkət etmək
**secretly** ['si:krɪtlɪ] *adv* gizli, xəlvəti, örtülü, üstüörtülü; **to be married ~ to *smb.*** bir kəslə gizli evli olmaq; **to learn *smth.* ~** bir şeyi gizli/xəlvəti öyrənmək
**sect** [sekt] *n* 1. *din.* sekta, təriqət, məzhəb; **religious ~** dini sekta/təriqət; **a minor Christian ~** kiçik xristian təriqəti; 2. istiqamət, cərəyan *(fəlsəfədə, siyasətdə və s.)*
**sectarian** [sek'teərɪən] *adj* təriqət, sektant; ~ **jealousies** təriqət qalmaqalı; ~ **politics** siyasətdə sektantlıq
**sectarianism** [sek'teərɪənɪzm] *n* sektantlıq, təriqətçilik; dəstəbazlıq
**section**[1] ['sekʃn] *n* 1. hissə, bölmə, şöbə; *This section of the road is closed Yolun bu hissəsi bağlıdır; The library has a large biology section Kitabxananın geniş biologiya bölməsi/şöbəsi var*; **head of the finance ~** maliyyə şöbəsinin başçısı; 2. hissə, parça; **the three ~s of a fishing-rod** balıq torunun üç parçası; 3. paraqraf; ~ 5 5-ci paraqraf; 4. kəsik, kəsim; **cross ~** köndələn/eninə kəsik; **horizontal/vertical ~** üfüqi /şaquli kəsik; 5. *amer.* kupe; ~ **of a sleeper** yataq vaqonunun kupesi
**section**[2] ['sekʃn] *v* bölmək, hissələrə ayırmaq/kəsmək; *Part of the town had been sectioned off Şəhərin bir hissəsi ayrılıb*
**sectional** ['sekʃnəl] *adj* 1. xüsusi, şəxsi; ayrı; qrup, qrup halında; yerli; ~ **differences** xüsusi /şəxsi fərqlər; ~ **quarrels** şəxsi mübahisələr; ~ **interests** şəxsi maraqlar; 2. seksiya, bölmə; quraşdırılmış, düzəldilmiş; sökülə bilən; ~ **furniture** sökülə bilən mebel/avadanlıq; **a ~ bookcase** bölməli/seksiyalı kitab şkafı;
◊ ~ **paper** cizgilənmiş/cızıqlanmış kağız
**sectionalism** ['sekʃnəlɪzm] *n* sektantlıq, təriqətçilik; dəstəbazlıq; yerliçilik
**sector** ['sektəʳ] *n* 1. sektor, bölmə; ~ **for throws** *id.* atma sektoru; **the socialized ~ of the economy** xalq təsərrüfatının ictimailəşdirilmiş sektoru/bölməsi; 2. *hərb.* sahə; zolaq; ~ **of attack** hücum sahəsi/zolağı; 3. proporsional pərgar
**secular** ['sekjuləʳ] *adj* 1. dünyəvi, dini olmayan; ~ **education** dünyəvi təhsil; ~ **architecture** dünyəvi/dini olmayan memarlıq; 2. əsrlik, yüzillik, yüz ildə bir dəfə olan/baş verən; ~ **variation** *astr. geol.* əsrlik/yüzillik dəyişmə; ~ **changes in temperature** temperaturda əsrlik dəyişikliklər
**secularism** ['sekjulərɪzm] *n* 1. təhsilin dövlətin kilsədən ayrılması haqqında doktrina; 2. dünyəvi təhsil haqqında mübarizə
**secularist** ['sekjulərɪst] *n* 1. kilsənin dövlətdən ayrılmasının tərəfdarı; 2. dünyəvi təhsil tərəfdarı
**secularize, -ise** ['sekjuləraɪz] *v* dünyəviləşdirmək; kilsədən ayırmaq *(təhsili və s.)*
**secure**[1] [sɪ'kjuəʳ] *adj* 1. sakit, dinc; arxayın, xatircəm; **to feel ~ about the future** gələcək haqqında arxayın/xatircəm olmaq; *I've my mind secure Mənim ürəyim arxayındır*; 2. inanmış, əmin; möhkəm əqidəli/məsləkli, məhəbbətinə/əqidəsinə etiqadlı; ~ **of success/of victory** müvəffəqiyyətə/qələbəyə əmin *(olan)*; **to be ~ of *smb.'s* affection** bir kəsin hisslərinə əmin olmaq; **to be ~ of *smb.'s* victory** bir kəsin qələbəsinə inanmaq/əmin olmaq; 3. möhkəm, bərk; sarsılmaz, əzmkar; ~ **lock** etibarlı qıfıl; ~ **foothold** möhkəm dayaq; *Is this ladder secure? Bu nərdivan möhkəmdirmi?; Our victory is secure Bizim qələbəmiz möhkəmdir/sarsılmazdır*; **a ~ belief** sarsılmaz/möhkəm inam; 4. təhlükəsiz, etibarlı; ~ **investments** kapitalın/ yatırımın etibarlı /təhlükəsiz qoyuluşu; ~ **retreat** etibarlı/ təhlükəsiz sığınacaq; **to make a country ~ against enemies**

ölkənin düşmənlərdən etibarlı müdafiəsini təmin etmək; **to be ~ from danger** təhlükədən azad olmaq; *We can feel secure now İndi biz özümüzü təhlükəsiz hiss edə bilərik*

**secure**[2] [sɪ'kjuəʳ] *v* **1.** müdafiə etmək, təhlükəsizliyi təmin etmək, qorumaq, mühafizə etmək; **to ~ a town** şəhəri müdafiə etmək; **2.** təminat/qarantiya vermək; **to ~ the liberty of** ***smb.*** bir kəsin azadlığına təminat vermək; **to ~ *smb.* from/against *smth.*** bir kəsə bir şey üçün təminat vermək; **3.** möhkəmlətmək; bağlamaq; qıfıllamaq; **to ~ the doors and windows** qapıları və pəncərələri bağlamaq; **4.** almaq, əldə etmək; **to ~ a house** ev almaq; **to ~ an order** sifariş almaq; **to ~ profits** gəlir əldə etmək; **to ~ a seat at the theatre** teatra bilet almaq/əldə etmək; **5.** *hərb.* zəbt etmək, tutmaq, ələ keçirmək; **to ~ the line** sərhədi/məntəqəni ələ keçirmək

**securely** [sɪ'kjuəlɪ] *adv* **1.** dinc, sakitcə, tələsşiz, arxayınca, təhlükəsiz olaraq; **to sleep ~** sakit /arxayınca yatmaq; **2.** etibarlı, sədaqətlə; möhkəm; **to be ~ hidden** etibarlı surətdə gizlədilmək; **to be ~ informed** etibarlı mənbədən məlumat almaq

**security** [sɪ'kjuərɪtɪ] *n* **1.** təhlükəsizlik; **system of collective ~** kollektiv təhlükəsizlik sistemi; **national ~** ölkənin təhlükəsizliyi; **personal ~** şəxsi təhlükəsizlik; **to live in ~** təhlükəsizlikdə yaşamaq; **2.** təhlükəsizlik təşkilatları; **3.** *amer.* əks-kəşfiyyat; **4.** inam, əminlik, təhlükəsizlik hissi; **to feel great ~** özünü tam təhlükəsiz hiss etmək; **5.** müdafiə, qoruma; *A good watch-dog is my security against burglars Yaxşı gözətçi it məni oğrulardan qoruyur*; **6.** *hərb.* qoruma, mühafizə, mühafizə edilmə; **~ against chemicals** zəhərləyici maddələr əleyhinə mühafizə; **7.** *hüq.* təmin etmə, qarantiya, girov; **~ for a claim** iddianı təmin etmə; **8.** *hüq.* zəmanət, zaminlik; **to give ~** zəmanət vermək, zamin durmaq; **to stand ~ for *smb.*** bir kəsə zamin durmaq; **9.** *hüq.* zamin, zamin olan; **to act as ~** zamin kimi hərəkət etmək; **10.** *adət. pl* qiymətli kağızlar; **government securities** qiymətli dövlət kağızları

**Security Council** [sɪ'kjuərɪtɪ'kaunsl] *n* Təhlükəsizlik Şurası *(BMT-də)*

**sedate** [sɪ'deɪt] *adj* **1.** təmkinli, ağır, vüqarlı; sakit; **~ in speech** sakit nitqlə; **2.** təvazökar, ədəbli, dinc; **a ~ old lady** təvazökar/ədəbli qoca xanım

**sedateness** [sɪ'deɪtnɪs] *n* təmkinlilik, vüqar, ağırlıq, ciddilik; müvazinət; sakitlik, soyuqqanlılıq

**sedative**[1] ['sedətɪv] *n* sakitləşdirici/ağrıkəsən dərman; **to give *smb.* a ~** bir kəsə sakitləşdirici/ağrıkəsən dərman vermək; *The doctor gave the sick man a sedative to help him sleep Həkim xəstənin yatmasına kömək etmək üçün ona ağrıkəsən dərman verdi*

**sedative**[2] ['sedətɪv] *adj* sakitləşdirən, sakitləşdirici, ağrıkəsən, ağrıkəsici; **a ~ drug** sakitləşdirici/ağrıkəsən dərman

**sedentary** ['sedəntərɪ] *adj* oturaq, oturan, hərəkətə az qabil olan; **to lead a ~ life** oturaq həyat keçirmək; **to be of a ~ nature** təbiətcə az hərəkət edən olmaq; **a ~ state of mind** ləng ağıl; **to be ~ in *one's* habits** xanənişin olmaq, evdə oturmağı sevmək; **~ work** oturaq iş

**sediment** ['sedɪmənt] *n* çöküntü, xılt, torta; **the ~ at the bottom of a wine bottle** şərab/çaxır butulkasının dibində çöküntü

**sedimentary** [ˌsedɪ'mentrɪ] *adj* yığıntı; **~ rocks** yığıntıdan əmələ gəlmiş qayalar; **~ layers** yığıntı layları

**sedimentation** [ˌsedɪmen'teɪʃn] *n geol.* çökmə, yığıntının çökməsi

**sedition** [sɪ'dɪʃn] *n* **1.** üsyana/qiyama təhrikçilik; dövlət əleyhinə təbliğat; **2.** üsyan, qiyam

**seditious** [sɪ'dɪʃəs] *adj* təhrikçi, qızışdırıcı, qiyamçı; **~ speech** təhrikçi/qızışdırıcı nitq; **~ writings** qızışdırıcı/təhrikçi əsərlər

**seduce** [sɪ'dju:s] *v* **1.** tamahsılandırmaq, şirnikdirmək, başdan/yoldan çıxartmaq, tovlamaq; **to ~ a woman** qadını yoldan çıxartmaq; **2.** valeh /məftun etmək; *I was seduced by the beauty of the nature Mən təbiətin gözəlliyinə valeh oldum, Təbiətin gözəlliyi məni valeh/məftun etdi*

**seducement** [sɪ'dju:smənt] *n* **1.** başdan/yoldan çıxartma, pis yola çəkmə, azdırma *(düz yoldan)*; məftun/valeh etmə; **2.** cazibədarlıq, cazibə, ehtiras/həvəs oyatma

**seducer** [sɪ'dju:səʳ] *n* azdıran, yoldan/başdan çıxardan, tamaha salan, pis yola çəkən *(xüs. cinsi əlaqə məqsədilə)*

**seduction** [sɪ'dʌkʃn] *n* **1.** yoldan/başdan çıxartma; pis yola düşmə; **2.** şirnikdirici/başdan çıxaran şey; cazibə

**seductive** [sɪ'dʌktɪv] *adj* cazibədar, cazibəli, cəzbedici, ehtiras oyadıcı; şirnikdirici, tamahsılandırıcı, həvəsləndirici; məftunedici, valehedici, heyranedici; **a ~ woman/girl/ smile/look** cazibədar qadın/qız/təbəssüm/baxış; **~ music/ voice** heyranedici musiqi/səs

**seductively** [sɪ'dʌktɪvlɪ] *adv* füsunkarcasına, cəlbedici/ məftunedici/valehedici bir tərzdə; **to smile ~** füsunkarcasına gülümsəmək

**seductiveness** [sɪ'dʌktɪvnɪs] *n* füsunkarlıq, cazibədarlıq məftunluq

**see**[1] [si:] *n* **1.** *kil.* yeparxiya *(xristianlıqda: arxierey tərəfindən idarə olunan dini inzibati vahid)*; **2.** taxt, taxt-tac; **3.** yepiskop *(baş keşiş)* rütbəsi; **4.** papalıq, papa hakimiyyəti

**see**[2] [si:] *v (pt* **saw**, *pp* **seen) 1.** görmək; **to ~ well/poorly** yaxşı/pis görmək; *Cats see well at night Pişiklər gecə yaxşı görürlər*; **to ~ nothing** heç nə/şey görməmək; *I looked around, but saw nothing Mən ətrafa baxdım, lakin heç nə görmədim*; **to ~ a film** film görmək; *I saw this film last*



*year Mən bu filmi keçən il görmüşəm; I've never seen such rudeness Mən heç vaxt belə qəddarlıq/kobudluq/qabalıq görməmişəm*; **to ~ *smth.* with *one's* own eyes** bir şeyi öz gözləri ilə görmək; *I saw the accident with my own eyes Mən hadisəni öz gözlərimlə gördüm*; **2.** baxmaq; *See page four Dördüncü səhifəyə bax/baxın*; **3.** təsəvvür etmək: *I can't see you old Mən səni/sizi qoca təsəvvür edə bilmirəm*; **4.** başa düşmək, dərk etmək; fikirləşmək; **to ~ a joke/the meaning** zarafatı/mənanı başa düşmək; *He can't see a joke O, zarafatı başa düşmür; I see what you mean Mən sənin/sizin nə demək istədiyini/istədiyinizi başa düşürəm; I see Başa düşürəm! Aydındır!* **to ~ about *smth.*** bir şey haqqında fikirləşmək; **to ~ about a new house** təzə ev haqqında fikirləşmək; **to ~ to the house** evə baxmaq, ev işləri görmək; **5.** göz qoymaq/yetirmək; nəzarət etmək; məşğul olmaq; **to ~ to *smth.*/to *smb.*** bir şeyə/bir kəsə nəzarət etmək/göz qoymaq, bir şeyə/bir kəsə göz yetirmək; **to ~ to the children** uşaqlara göz qoymaq/yetirmək/nəzarət etmək; *We'll see to everything Biz hər şeyə göz qoyacağıq; I'll see to it Mən bununla məşğul olacam*; **to ~ after *smb./smth.*** bir kəsə/şeyə baxmaq, bir kəsə/şeyə qulluq etmək; bir kəsin/şeyin qeydinə qalmaq; *I'm going to see after the children Uşaqlara mən baxacam, Mən uşaqlarla məşğul olacam*; **to ~ after *one's* own interests** öz maraqlarının qeydinə qalmaq; **6.** ötürmək; **to ~ *smb.* to some place** bir kəsi bir yerə ötürmək; **to ~ *smb.* home** bir kəsi evə ötürmək; *Let me see you home İcazə ver/verin mən səni/sizi evə ötürüm*; **to ~ off** yola salmaq, ötürmək; **to ~ *smb.* off at the station** bir kəsi qatarla yola salmaq; *I want somebody to see me off Mən istəyirəm ki, kimsə məni ötürsün*; **7.** öyrənmək, başa düşmək; **to ~ into *smth.*** bir şeyi öyrənmək/başa düşmək/anlamaq; **to ~ into a matter** məsələni öyrənmək; məsələyə baxmaq; *The lawyer will see into your claim Vəkil sənin/sizin iddiana/iddianıza baxacaq*; **8.** baş çəkmək; **to ~ *smb.*** bir kəsə baş çəkmək; *Come up and see me some time Bir gün gəlib mənə baş çək/çəkin*; **to ~ out** yola salmaq, ötürmək *(qapıya, çıxışa qədər)*; *She saw me out (of) the room O məni qapıya qədər ötürdü/yola saldı*; **to ~ a match out** yarışı axıra qədər izləmək; **to ~ through** axıra qədər iştirak etmək; **to ~ the war through** sona qədər müharibədə iştirak etmək; **to ~ a business through** işi sona çatdırmaq; **to ~ *smb.* through illness** bir kəsə bütün xəstəlik müddəti kömək etmək;

◊ *See here! amer. Qulaq as/asın!*; **to ~ snakes** doyunca/yıxılana qədər içmək; **to ~ red** qəzəblənmək, hiddətlənmək; **to ~ the light/the world** doğulmaq, dünyaya gəlmək/göz açmaq; **to ~ the back of *smb.*** bir kəsdən yaxa qurtarmaq; **to ~ no further than *one's* nose** burnunun ucundan qabağı/uzağı görməmək

**seed**[1] [si:d] *n* **1.** toxum, tum; **~s of an apple** alma tumları; **pomegranate ~** nar tumu; **handful of ~s** bir ovuc toxum/tum; **a large bag of grass ~** bir böyük kisə ot toxumu; **to be kept for/as ~** toxumluq üçün saxlanılmaq; **to keep onions for ~** soğanı toxumluq üçün saxlamaq; **2.** *biol.* sperma, məni; **3.** nəsil, övlad; *According to the Bible we are all the seed of Adam İncilə görə biz hamımız Adəmin övladlarıyıq*; **4.** mənbə, başlanğıc; **the ~s of disease** xəstəliyin mənbəyi; **5.** dən *(quşlar üçün yem)*;

◊ **to go/to run to ~ 1)** toxumlamaq; **2)** tənəzzül etmək; **3)** mənəviyyatca düşkünləşmək

**seed**[2] [si:d] *adj* toxum; toxumçuluq, toxumluq; **~ ball** toxum qozası; **~ farming** toxumçuluq təsərrüfatı; **~ potato** toxumluq kartof; **~ stock** toxum fondu

**seed**[3] [si:d] *v* **1.** toxumlamaq, toxum vermək; **2.** toxum səpmək; **3.** tumunu təmizləmək, tumunu çıxartmaq *(meyvə, tərəvəz haq.)*; **4.** *id.* seçmək; *Competitors were seeded in the draw Yarış iştirakçıları püşk atma yolu ilə seçildi*

**seed-bearing** ['si:d.beərɪŋ] *adj bot.* toxumlayan, toxum verən; **~ plants** toxumlayan/toxum verən bitkilər

**seed-breeding** ['si:d.bri:dɪŋ] *n k.t.* toxumçuluq; toxum vermə

**seed-cleaning** ['si:d.kli:nɪŋ] *n k.t.* toxum təmizləmə

**seed-coat** ['si:dkout] *n* toxum qabığı

**seeder** ['si:dəʳ] *n k.t.* toxumsəpən, səpici maşın

**seed grower** ['si:d.grouəʳ] *n k.t.* toxumçu, toxumçuluq mütəxəssisi

**seed growing** ['si:d.grouɪŋ] *n k.t.* toxumçuluq, toxum becərmə

**seediness** ['si:dɪnɪs] *n* **1.** tumluluq; toxumlu/tumlu olma; **2.** kasıblıq, yoxsulluq; **the ~ of his lodgings** onun otağının/mənzilinin yoxsulluğu

**seedless** ['si:dlɪs] *adj* tumsuz, toxumsuz; **~ grapes/oranges** tumsuz üzüm/portağal

**seedling** ['si:dlɪŋ] *n k.t.* toxmacar *(toxumdan cücərən bitki)*; cücərti, cücərmə; şitil; qələm, tingə; **tomato ~** pomidor şitili

**seed-pearl** ['si:d'pə:l] *n* xırda mirvari

**seedsman** ['si:dzmən] *n (pl* **-men** [-mən]) toxumçu, toxum becərən, toxumsatan

**seedy** ['si:dɪ] *adj* (**-ier, -iest**) **1.** tumlu; **a ~ orange** tumlu portağal; **2.** *d.d.* köhnə, geyilmiş, yırtılmış, didilib tökülmüş; **~ clothes** köhnəlmiş/yırtılmış/geyilmiş paltar; **3.** kasıb, yoxsul, miskin; **a ~ part of the town** şəhərin kasıb/miskin hissəsi; **4.** naxoş, xəstə; **to feel ~** özünü naxoş hiss etmək

**seek** [si:k] *v (pt, pp* **sought** [sɔ:t]) **1.** axtarmaq, tapmağa çalışmaq/cəhd etmək; **to ~ shelter** sığınacaq axtarmaq; **to ~ happiness/comfort**

xoşbəxtlik/rahatlıq axtarmaq; **to ~ out** ***one's*** **friend in the crowd** camaatın/izdihamın içində dostunu axtarmaq; **to ~ (after) the truth** həqiqət axtarmaq; 2. əldə etmək, nail/müvəffəq olmaq; **to ~** ***smb.'s*** **help/***smb.'s* **approval** bir kəsin köməyini/ razılığını əldə etmək; **to ~ wealth/glory** var-dövlətə/ şöhrətə nail olmaq; 3. xahiş/rica/müraciət etmək; **to ~ information** məlumat üçün müraciət etmək; *He came seeking advice O, məsləhət almaq üçün gəldi*; **to ~ out** axtarmaq; **to ~ out the author of a crime** cinayətin səbəbkarını axtarmaq;

◊ **to ~** ***one's*** **bed** yatmaq, uzanıb yatmaq; **to ~** ***smb.'s*** **life** bir kəsin həyatına qəsd etmək

**seeker** ['si:kə<sup>r</sup>] *n* axtaran; **an asylum ~** daldalanacaq axtaran; **gold ~s** qızılaxtaranlar

**seem** [si:m] *v* 1. görünmək; ...gəlmək, ...kimi gəlmək/ görünmək; *She always seems (to be) sad O həmişə qəmli/qəmgin görünür; He seemed old to me O mənə qoca göründü; It seems good to me to do it Mənə elə gəlir ki, bunu etmək doğrudur/məqsədəuyğundur; He seemed to be a good man O, yaxşı adam kimi göründü; This wine seems rather good Belə görünür ki, bu şərab çox yaxşıdır; It seemed as though/as if he didn't understand what I was saying Məlum oldu ki, o mənim nə dediyimi başa düşmədi*; 2. müəyyən fikri/rəyi olmaq;

◊ *It seems Görünür, Görünür ki, Ehtimal ki; There seems Deyəsən; It seems to be getting cold Deyəsən soyuqlaşır*

**seeming**[1] ['si:mɪŋ] *n* zahiri cəhət, görünüş; **the ~ and the real** görünüş və reallıq

**seeming**[2] ['si:mɪŋ] *adj* 1. görünən, zahiri; xəyali, göz qabağına gətirilən, təsəvvür edilən; **a ~ friend** zahiri dost; 2. saxta, yalançı, ikiüzlü, riyakar, süni; **~ sincerity** saxta/yalançı səmimiyyət; **his ~ loyalty** onun uydurma/ saxta/süni etibarı/sədaqəti; **~ friendship** saxta/süni/ yalançı dostluq

**seemingly** ['si:mɪŋlɪ] *adv* 1. yəqin, yəqin ki, görünür, görünür ki, ehtimal ki; *They were seemingly unaware of the decision Ehtimal ki, onların qərardan xəbəri yox idi*; 2. görünüşcə, xarici görkəmcə; **an old man ~ more than 80 years of age** xarici görkəmcə yaşı 80-dən artıq bir qoca kişi

**seemliness** ['si:mlɪnɪs] *n* münasiblik, layiqlik, ləyaqətlilik

**seemly**[1] ['si:mlɪ] *adj* münasib, layiqli, yaraşan; münasib/ layiq olan; *It's not seemly to praise oneself Özünü tərifləmək yaraşan (iş) deyil; It's not seemly that I should go there alone Mənim ora tək getməyim münasib/yaraşan deyil*

**seemly**[2] ['si:mlɪ] *adv* yaxşı, faydalı, layiqli, ləyaqətlə, yaraşan kimi

**seen**[1] [si:n] **to see** *felinin pp forması*

**seep** [si:p] *v* axmaq, axıb getmək, sızmaq, keçmək *(su və s.)*; dammaq, su buraxmaq; *The water seeps through the earth Su torpaqdan sızır; Petrol is seeping through a crack in the tank Benzin bakın çatlağından sızır/axır/axıb gedir*

**seepage** ['si:pɪdʒ] *n* 1. axma, sızma, axıb getmə *(su və s. haq.)*; 2. infiltrasiya *(süzmə)*

**seer** [sɪə<sup>r</sup>] *n* peyğəmbər, rəsul; gələcəyi xəbər verən, qabaqgörən, gələcəyi bilən *(adam)*

**see-saw**[1] ['si:sɔ:] *n* yelləncək *(ağac üstə qoyulub taxtadan düzəldilmiş)*

**see-saw**[2] ['si:sɔ:] *v* 1. irəli-geri/ yuxarı-aşağı hərəkət etmək; 2. tərəddüd etmək, qətiyyətsizlik göstərmək; **to ~ between two opinions** iki fikir arasında qalmaq/ qətiyyətsizlik göstərmək; 3. taxta üzərində yellənmək/ enib-qalxmaq

**see-saw**[3] ['si:sɔ:] *adv* aşağı-yuxarı, yuxarı-aşağı, irəli-geri; **to go ~** aşağı-yuxarı/irəli-geri getmək

**seethe** [si:ð] *v* qaynamaq, coşmaq; *The water was seething Su qaynayırdı; The sea was seething Dəniz coşurdu*

**seething** ['si:ðɪŋ] *adj* qaynayan, coşan; **~ water** qaynayan su; **~ sea** coşan dəniz; *They were looking at the seething sea with interest Onlar coşan dənizə maraqla baxırdılar*

**segment**[1] ['segmənt] *n* 1. hissə, qisim; bir hissə, parça; 2. dilim, fal; **a ~ of an orange** portağal dilimi/falı; 3. *riyaz.* seqment *(vətər ilə qövs arasında qalan dairə parçası)*

**segment**[2] ['segmənt] *v* 1. hissələrə/parçalara bölmək; 2. dilimləmək, fal-fal/dilim-dilim etmək; 3. hissələrə/parçalara bölünmək; fal-fal/dilim-dilim olmaq

**segmental** ['segmentl] *adj* seqment; seqment formalı; hissələrə ayrılan

**segmentation** [ˌsegmən'teɪʃn] *n* 1. bölünmə; dilimlərə/fallara ayrılma; **a ~ of the job** işin bölünməsi; 2. seqmentasiya *(bəzi orqanizmlərin buğumlar şəklində olması)*

**segregate** ['segrɪgeɪt] *v* 1. bölmək, ayırmaq, təcrid etmək; **to ~ cholera patients** vəba xəstəliyinə tutulmuş xəstələri ayırmaq/təcrid etmək; 2. ayrılmaq, bölünmək, təcrid olunmaq

**segregation** [ˌsegrɪ'geɪʃn] *n* ayrılma, bölünmə, təcrid, təcrid olunma/etmə; **a policy of racial ~** irqi təcrid etmə siyasəti

**seismic** ['saɪzmɪk] *adj* seysmik; **~ country** seysmik ölkə; **~ activity** seysmik aktivlik

**seismograph** ['saɪzməgra:f] *n* seysmoqraf *(yer səthinin titrəyişini (zəlzələni) avtomatik surətdə qeyd edən aparat)*

**seismologist** [saɪz'mɒlədʒɪst] *n* seysmoloq *(zəlzələ mütəxəssisi)*

**seismology** [saɪz'mɒlədʒɪ] *n* seysmologiya *(geologiyanın yer qabığının titrəyişindən bəhs edən şöbəsi)*

**seismometer** [saɪz'mɒmɪtə<sup>r</sup>] *n* seysmometr *(zəlzələni qeyd edən cihaz)*

**seize**[1] [si:z] *n* tutma, yapışma; qapma, qarmalama



**seize**[2] [si:z] *v* 1. tutmaq; yapışmaq; **to ~ a rope** kəndirdən tutmaq/yapışmaq; **to ~** ***smb.*** **by the arm/by the throat** bir kəsin qolundan/boğazından yapışmaq/tutmaq; *She seized me by the wrist O mənim biləyimdən tutdu/yapışdı*; 2. qapmaq, qarmalamaq; *He seized my bag and ran off O mənim çantamı qapdı və qaçıb getdi*; 3. həbs etmək, tutmaq; **to ~ a thief** oğrunu həbs etmək/tutmaq; **to ~ a criminal** cinayətkarı həbs etmək; 4. zəbt /qəsb etmək, ələ keçirmək; **to ~ the throne** taxtacı zəbt/qəsb etmək; 5. müsadirə etmək, başını bağlamaq; **to ~ documents** sənədləri müsadirə etmək; *His property will be seized Onun əmlakı müsadirə ediləcək/olunacaq*; 6. istifadə etmək, yapışmaq; **to ~ an opportunity** imkandan istifadə etmək; **to ~ a suggestion/a chance** təklifdən /imkandan yapışmaq; 7. başa düşmək, anlamaq; **to ~ the point/the essence of the matter** məsələnin mahiyyətini başa düşmək/ anlamaq; *I can't quite seize his meaning Mən onun nə demək istədiyini tamamilə başa düşə bilmirəm*; 8. bürümək; *He was seized with terror/with fear Onu dəhşət/qorxu bürümüşdü*

**seizing** ['si:zɪŋ] *n* tutma, yapışma, sahib/malik olma; **~ of cough** öskürək tutması

**seizure** ['si:ʒə<sup>r</sup>] *n* 1. zəbt, istila, zəbt/istila etmə; **the ~ of another's property** başqasının əmlakını zəbt etmə; **the ~ of power by the army** ordu tərəfindən hakimiyyətin zəbt olunması; 2. *tib.* tutma, ürəkkeçməsi; **to have a ~** tutması /ürəkkeçməsi olmaq

**seldom** ['seldəm] *adv* arabir, nadir hallarda, az-az; **very ~** çox nadir hallarda; *She very seldom goes to the theatre O, teatra çox nadir hallarda gedir;*

◊ *Seldom seen soon forgotten ≅ Gözdən uzaq, könüldən iraq*

**select**[1] [sɪ'lekt] *adj* 1. seçilmiş, seçmə; **~ society /company** seçilmiş cəmiyyət/dost-aşna; **a few ~ friends** bir neçə seçilmiş dostlar; **dinner cosisting of a few ~ dishes** bir neçə seçmə xörəkdən ibarət nahar; **a documentary shown to a ~ audience** seçilmiş tamaşaçılara göstərilən sənədli film; 2. kübar, zadəgan, çoxlarının əli çatmayan: **~ watering-place** kübarlar üçün kurort; **~ part of the city** şəhərin zadəganlar yaşayan hissəsi; **a ~ club** seçmə adamlar üçün klub

**select**[2] [sɪ'lekt] *v* seçmək; **to ~ gift** hədiyyə seçmək; **to ~ wine** şərab/çaxır seçmək; **to ~ candidate** namizəd seçmək; **to ~ tastefully /painstakingly** zövqlə/diqqətlə seçmək; *He selected a pair of socks to match his suit O, kostyumuna düşən/yaraşan bir cüt corab seçdi*

**selected** [sɪ'lektɪd] *adj* seçilmiş; **~ stories /works** seçilmiş hekayələr/əsərlər; **~ apples /pears / oranges** seçilmiş almalar/armudlar/portağallar; **~ goods** seçilmiş mal

**selection** [sɪ'lekʃn] *n* 1. seçim; **careful/occasional/ conscious ~** diqqətli/təsadüfi/şüurlu seçim; **to make** ***one's*** **own ~** öz seçimini etmək; **to make a ~ from** ***smth.*** bir şeydən seçmək; *This hat is her own selection Bu şlyapa onun öz seçimidir, Bu şlyapanı o özü seçib*; 2. çeşid; **extensive/unlimited/rich ~** geniş/hədsiz/zəngin çeşid; 3. seçilmiş əsərlər toplusu; **~s from the poets** şairlərin seçilmiş əsərləri; 4. *biol.* seçmə; seleksiya *(seçmə, süni artırma və s. yolu ilə bitki növlərinin və ya heyvan cinslərinin yaxşılaşdırılması)*; **natural/artificial ~** təbii/süni seçmə

**selective** [sɪ'lektɪv] *adj* seçmə, seçilmiş, ən yaxşı, əla; **~ cataloguing** seçmə/seçilmiş kataloq; **~ control on goods brought into country for sale** satış üçün ölkəyə gətirilən malların üzərində seçmə nəzarət;

◊ **~ service** *amer. hərb.* hərbi mükəlləfiyyət

**selectively** [sɪ'lektɪvlɪ] *adv* adda-budda, ordan-burdan, seçmə yolu ilə

**selectivity** [ˌsɪlek'tɪvɪtɪ] *n biol.* seçmə qabiliyyəti *(orqanizmin xarici mühitə qarşı seçicilik qabiliyyəti)*

**selector** [sɪ'lektə<sup>r</sup>] *n* 1. seçən, çeşidləyən; kompilyator, kompilyasiyaçı, kompilyasiya ilə məşğul olan adam; 2. selektor *(aparat)*; 3. diapazonu dəyişən açar, köklənmə dəstəyi *(radio aparatında və s.)*

**self**[1] [self] *n (pl* **selves** [selvz]) mahiyyət; sifət, sima, xüsusiyyətlərin/xassələrin məcmusu; **my own/very ~** şəxsən mən özüm; ***one's*** **better ~** insana xas olan ən yaxşı xüsusiyyət; ***one's*** **former ~** insanın əvvəlki siması; **my former ~** mənim əvvəlki simam/sifətim; **to be** ***one's*** **own ~** tək/tənha/yalqız olmaq; **to be in love with** ***one's*** **own ~** özünü sevmək, özünə vurulmaq; **to get a glimpse of Shakespeare's very ~ in the Sonnets** Sonetlərini oxuyarkən Şekspirin daxili mahiyyətini dərk etmək/anlamaq; **inmost ~** daxili mahiyyət; **to be conscious of ~** özü özünü dərk etmək;

◊ *Self comes first Hər şeydən əvvəl adamın öz canıdır*

**self**[2] [self] *pron* mən özüm; **a room for ~ and wife** mənim özüm və arvadım üçün otaq

**self-** [self-] 1. *mürəkkəb sözlərin komponenti: Azərbaycan türkcəsində* **özünü/özünə** *söz-lərinə uyğun gəlir;* **self-defence özünümüdafiə**; **self-control özünənəzarət**; **self-criticism özünütənqid**; 2. *qayıdış əvəzliklərinin tərkib hissəsi*; **myself** özüm; **yourself** özün; **himself** özü *(kişi cinsi üçün)*; **herself** özü *(qadın cinsi üçün)*; **itself** özü *(orta cins üçün)*; **ourselves** özləri; **yourselves** özünüz; **themselves** özləri; *I can do it myself Mən bunu özüm edə bilərəm; Can you do it yourself Sən/Siz özün/ özünüz bunu edə bilərsənmi/bilərsinizmi?; He can take the box himself O, qutunu özü götürə bilər; She ought to read the book herself O, kitabı gərək özü oxusun; We must defend our country ourselves Biz vətənimizi özümüz qorumalıyıq; You must*

*invite the guests yourselves Qonaqları siz özünüz dəvət etməlisiniz; They will go there themselves Onlar ora özləri gedəcəklər*

**self-abandoned** [ˈselfəˈbændənd] *adj* özünü saxlaya bilməyən, həddini aşan, hədd-hüdud bilməyən; impulsiv; tez coşan/qızışan, çılğın

**self-abandonment** [ˈselfəˈbændənmənt] *n* özünü /öz mənafeyini unutma; fədakarlıq; **to rouse a person from/out of his ~** adamı reallığa qaytarmaq; **hopeless ~** ümidsiz fədakarlıq

**self-abuse** [ˈselfəˈbju:s] *n* özünü alçaltma, öz şəxsiyyətini/ qabiliyyətini kiçiltmə

**self-abusement** [ˈselfəˈbju:smənt] *n* **1**. öz gücündən/ bacarığından həddən artıq istifadə etmə; **2**. *tab.s.* onanizm, kəfləmə; **3**. *arx.* özünü aldatma

**self-accusation** [ˈself.ækju:ˈzeɪʃn] *n* özünü təqsirləndirmə/ suçlama

**self-acting** [ˈselfˈæktɪŋ] *adj* avtomatik, öz-özünə /avtomatik işləyən; **a ~ regulator** avtomatik /öz-özünə işləyən, avtomatik tənzimləyici/nizamlayıcı

**self-action** [ˈselfˈækʃn] *n* öz-özünə/biixtiyar baş verən/ qeyri-ixtiyari hərəkət

**self-addressed** [.selfəˈdrest] *adj* özünə ünvanlanan; **a ~ envelope** özünə ünvanlanan zərf

**self-adjustment** [ˈselfəˈdʒʌstmənt] *n* öz-özünə tənzimlənmə/ nizamlanma

**self-admiration** [ˈself.ædməˈreɪʃn] *n* özünü bəyənmə, özünün özündən xoşu gəlmə, özündən bədgüman olma

**self-advertisement** [ˈselfədˈvə:tɪsmənt] *n* özünü tərifləmə/ şöhrətləndirmə/reklam etmə

**self-affirmation** [ˈself.æfə:ˈmeɪʃn] *n* özünütəsdiq

**self-apparent** [ˈselfəˈpærənt] *n* öz-özünə məlum/ bəlli/ aydın olma

**self-applause** [ˈselfəˈplɔ:z] *n* öyünmə, öz-özünü öymə/tərifləmə, lovğalanma

**self-approval** [ˈselfəˈpru:vəl] *n* özünü bəyənmə, təkəbbür, məğrurluq, təkəbbürlülük

**self-arising** [ˈselfəˈraɪzɪŋ] *adj* öz-özünə əmələ gələn/ törəyən

**self-assertion** [ˈselfəˈsə:ʃn] *n* **1**. özünə qürrələnmə/ güvənmə/inanma/arxayın olma; lovğalıq; **2**. cəsarət, cürət

**self-assertive** [ˈselfəˈsə:tɪv] *adj* **1**. özünə qürrələnən/ güvənən/inanan/arxayın olan; lovğa; **2**. qətiyyətli, cəsarətli, cürətli, inamlı

**self-assurance** [ˈselfəˈʃuərəns] *n* **1**. özünə qürrələnmə/güvənmə/inanma/arxayın olma; lovğalıq; **2**. cəsarət, cürət

**self-assured** [ˈselfəˈʃuəd] *adj* **1**. özünə qürrələnən/ güvənən/inanan/arxayın olan; saymaz; **2**. qətiyyətli, cürətli, cəsarətli

**self-betrayal** [ˈselfbɪˈtreɪəl] *n* öz-özünə xəyanət etmə

**self-centred** [ˈselfˈsentəd] *adj* xudbin, eqoist; **a ~ man** xudbin adam

**self-colour** [ˈselfˈkʌləʳ] *n* yekrənglik, sayalıq, birrənglik

**self-coloured** [ˈselfˈkʌləd] *adj* birrəng, yekrəng, birrəngli, saya *(parça və s. haq.)*

**self-conceit** [ˈselfkənˈsi:t] *n* lovğalıq, iddia, məğrurluq, özündən bədgümanlıq, özü haqqında böyük fikirdə olma

**self-conceited** [ˈselfkənˈsi:tɪd] *adj* lovğa, təkəbbürlü; dikbaş, təşəxxüslü

**self-condemnation** [ˈself.kɔndemˈneɪʃn] *n* özünü qınama/ məzəmmət etmə, öz hərəkətlərindən peşman olma, özünü təqsirləndirmə/suçlama

**self-confidence** [ˈselfˈkɔnfɪdəns] *n* özünə qürrələnmə/ inanma/güvənmə/arxayın olma; lovğalıq; **lack of ~** özünə inamsızlıq; **to display ~** inamsızlıq göstərmək/ nümayiş etdirmək

**self-confident** [ˈselfˈkɔnfɪdnt] *adj* **1**. özünə inanan/qürrələnən/güvənən; lovğa, saymaz; **2**. qətiyyətli, cürətli, cəsarətli

**self-confidently** [ˈselfˈkɔnfɪdntlɪ] *adv* **1**. özünə qürrələnərək /arxayın olaraq/güvənərək; lovğa-lovğa; **2**. cəsarətlə, cürətlə, inamla

**self-conscious** [ˈselfˈkɔnʃəs] *adj* utancaq, tez utanan; **to make *smb.* ~** bir kəsi utandırmaq

**self-consciously** [ˈselfˈkɔnʃəslɪ] *adv* utana-utana, sıxıla-sıxıla, utanaraq, sıxılaraq, karıxa-karıxa

**self-consistency** [ˈselfˈkənˈsɪstənsɪ] *n* **1**. sabitlik, daimilik, dəyişməzlik; **2**. ardıcıllıq, məntiqilik

**self-consistant** [ˈselfkənˈsɪstənt] *adj* **1**. daimi, həmişəlik; arasıkəsilməz, arası kəsilməyən; **2**. ardıcıl, məntiqi

**self-contained** [ˈselfkənˈteɪnd] *adj* **1**. təmkinli, səbirli, özünü /nəfsini saxlaya bilən, təvazölü, ehtiyatlı; **2**. adamdanqaçan, adamayovuşmaz, qaradinməz, ünsiyyətsiz; **3**. ayrı, təcrid olunmuş *(ev, mənzil haq.)*; **a ~ flat** ayrı mənzil

**self-content** [ˈselfkənˈtent] *n* özünü bəyənmə, təkəbbür, məğrurluq

**self-contented** [ˈselfkənˈtentɪd] *adj* özünübəyənən, özündən razı olan, öz nöqsanını görməyən; məğrur

**self-contradiction** [ˈself.kɔntrəˈdɪkʃn] *n* daxili ziddiyyət

**self-contradictory** [ˈself.kɔntrəˈdɪktərɪ] *adj* daxili ziddiyyəti olan, ziddiyyətli

**self-control** [ˈselfkənˈtroul] *n* səbir, təmkin, dözüm, soyuqqanlılıq, iradə, özünü saxlama/itirməmə, təmkinlilik, səbirlilik, özünü saxlaya bilmə; **to lose *one's* ~** təmkinini/səbrini itirmək; **to keep *one's* ~** səbrini/təmkinini /dözümünü itirməmək; **to exercise ~** təmkinlilik/səbirlilik/dözümlülük göstərmək

**self-critical** [ˈselfˈkrɪtɪkəl] *adj* özünütənqid ruhunda/ qaydası ilə

**self-criticism** [ˈselfˈkrɪtɪsɪzm] *n* özünütənqid

**self-deceit** [ˈselfdɪˈsi:t] *n* özünü aldatma, xam xəyal, xülya

**self-defence** [ˈselfdɪˈfens] *n* özünümüdafiə, özünüqoruma; qorunma, müdafiə; **collective ~** kollektiv/birgə müdafiə; **for/in ~** özünümüdafiə/özünüqoruma üçün; *He issued a statement in self-defence O, özünümüdafiə məqsədi ilə bəyanatla çıxış etdi*;
◊ **the art of ~** boks



**self-defensive** [ˈselfdɪˈfensɪv] *adj* müdafiə

**self-delusion** [ˈselfdɪˈlju:ʒn] *n* öz-özünü aldatma, xəyala qapılma

**self-denial** [ˈselfdɪˈnaɪl] *n* fədakarlıq, özünü qurban vermə, canından keçmə

**self-dependence** [ˈselfdɪˈpendəns] *n* müstəqillik, sərbəstlik, istiqlaliyyət, asılı olmama

**self-dependent** [ˈselfdɪˈpendənt] *adj* müstəqil, sərbəst, asılı olmayan

**self-destroyer** [ˈselfdɪsˈtrɔɪəʳ] *n* özünü öldürən, intihar edən *(adam)*

**self-destruction** [ˈselfdɪsˈtrʌkʃn] *n* özünü öldürmə, intihar, özünü həlak/məhv etmə

**self-destructive** [ˈselfdɪsˈtrʌktɪv] *adj* təhlükəli, fəlakətli, qorxulu *(özü üçün)*

**self-determination** [ˈselfdɪ.tə:mɪˈneɪʃn] *n* **1**. öz müqəddəratını təyin etmə; **the right of peoples to ~** millətlərin/xalqların öz müqəddəratını təyin etmə hüququ; **2**. müstəqillik

**self-determined** [ˈselfdɪˈtə:mɪnd] *adj* müstəqil; tabe/asılı olmayan, sərbəst; **~ countries** müstəqil ölkələr

**self-development** [ˈselfdɪˈveləpmənt] *n* öz-özünə/daxili səbəblərdən törəyən inkişaf

**self-devotion** [ˈselfdɪˈvouʃn] *n* **1**. sədaqət, vəfa; **2**. fədakarlıq, özünü qurban vermə, canından keçmə

**self-display** [ˈselfdɪsˈpleɪ] *n* özünü tərifləmə/öymə, özünü şöhrətləndirmə

**self-distrust** [ˈselfdɪsˈtrʌst] *n* özünə inamsızlıq

**self-education** [ˈself.edʒuˈkeɪʃn] *n* öz-özünə təhsil alma, şəxsi təhsil

**self-esteem** [ˈselfɪsˈti:m] *n* özünə hörmət, özünə hörmət etmə; mənlik, heysiyyət

**self-evident** [ˈselfˈevɪdnt] *adj* öz-özünə aydın olan, aydın, aşkar, bəlli, şübhəsiz, göz qabağında olan, sübuta ehtiyacı olmayan; **~ truth** şübhəsiz/sübuta ehtiyacı olmayan həqiqət

**self-examination** [ˈselfɪg.zæmɪˈneɪʃn] *n* **1**. özünü yoxlama; **2**. özünütənqid, öz nöqsanlarını tənqid

**self-executing** [ˈselfˈeksɪkju:tɪŋ] *adj* dərhal qüvvəyə minən *(qanun, müqavilə və s.)*

**self-explanatory** [ˈselfɪksˈplænətərɪ] *adj* aydın, aşkar, izahat tələb etməyən

**self-expression** [ˈselfɪksˈpreʃn] *n* öz-özünü izah etmə

**self-forgetful** [ˈselfəˈgetfl] *adj* fədakar; təmənnasız, qərəzsiz, şəxsi mənfəət güdməyən

**self-forgetfulness** [ˈselfəˈgetflnɪs] *n* **1**. öz mənfəətini unutma; **2**. fədakarlıq; təmənnasızlıq, qərəzsizlik, şəxsi mənfəət güdməmə

**self-governing** [ˈselfˈgʌvnɪŋ] *adj* özü-özünü idarə edən; **~ territory** özü-özünü idarə edən ərazi

**self-government** [ˈselfˈgʌvnmənt] *n* özünüidarə; muxtariyyət; **complete/partial ~** tam/yarım muxtariyyət; **to obtain ~** muxtariyyət almaq /əldə etmək

**self-grafting** [ˈselfˈgra:ftɪŋ] *n bot.* iki budağın bitişməsi, öz-özünə calanma

**self-healing** [ˈselfˈhi:lɪŋ] *n* öz-özünə sağalma, öz-özünü sağaltma

**selfhood** [ˈselfhud] *n* **1**. şəxsiyyət, şəxs, adam, fərdiyyət; **2**. eqoizm *(özü barədə çox böyük fikirdə olma)*

**selfhumiliation** [ˈselfhju.mɪˈlɪeɪʃn] *n* özünü alçaltma, öz qabiliyyətini /şəxsiyyətini kiçiltmə

**self-importance** [ˈselfɪmˈpɔ:tns] *n* özü haqqında yüksək fikirdə olma; iddia/təkəbbür satma, özünü çəkmə, lovğalanma

**self-important** [ˈselfɪmˈpɔ:tnt] *adj* lovğa, iddialı, təkəbbürlü, özünü çəkən/dartan, özü haqqında yüksək/ böyük fikirdə olan

**self-improvement** [ˈselfɪmˈpru:vmənt] *n* öz-özünə yaxşılaşma

**selfing** [ˈselfɪŋ] *n bot.* özü/öz-özünə tozlanan

**self-interest** [ˈselfˈɪntrɪst] *n* öz mənfəətini güdmə, mənfəətpərəstlik, tamahkarlıq; **unshamed ~** utanmaz mənfəətpərəstlik/tamahkarlıq; **obvious ~** açıq-aşkar tamahkarlıq/ mənfəətpərəstlik; **to do *smth.* from ~** bir şeyi mənfəətpərəstlik ucbatından etmək

**self-interested** [ˈselfˈɪntrɪstɪd] *adj* xudbin, tamahkar, mənfəət güdən

**self-invited** [ˈselfɪnˈvaɪtɪd] *adj* çağırılmamış, dəvət olunmamış *(qonaq haq.)*

**selfish** [ˈselfɪʃ] *adj* eqoist, xudbin, ancaq özünü sevən; **a ~ man** eqoist/xudbin adam; *Don't be so selfish Belə eqoist/xudbin olma/olmayın*

**selfishly** [ˈselfɪʃlɪ] *adv* xudbincəsinə, eqoistcəsinə; **to act ~** xudbincəsinə/eqoistcəsinə hərəkət etmək

**selfishness** [ˈselfɪʃnɪs] *n* xudbinlik, eqoizm, eqoistlik

**self-justification** [ˈself.dʒʌstɪfɪˈkeɪʃn] *n* özünə haqq/bəraət qazandırma, özünü təmizə çıxartma

**self-knowledge** [ˈselfˈnɔlɪdʒ] *n* özünü dərketmə

**self-laudation** [ˈselflɔˈdeɪʃn] *n* öyünmə, özünü tərifləmə, lovğalanma

**selfless** [ˈselflɪs] *adj* fədakar, təmənnasız, tamahsız, qərəzsiz, şəxsi mənfəət güdməyən

**selflessly** [ˈselflɪslɪ] *adv* təmənnasız, tamahsız, qərəzsiz, qərəzsiz olaraq

**self-murder** [ˈselfˈmə:dəʳ] *n* özünü öldürmə, intihar

**self-murderer** [ˈselfˈmə:dərəʳ] *n* özünü öldürən, intihar edən *(adam)*

**self-neglect** [ˈselfnɪˈglekt] *n* **1**. pintilik, səliqəsizlik; **2**. təmənnasızlıq, tamahsızlıq, şəxsi mənfəət güdməmə

**self-portrait** [ˈselfˈpɔ:trɪt] *n* avtoportret *(rəssamın çəkdiyi öz şəkli)*

**self-possessed** [ˈselfpəˈzest] *adj* təmkinli, təvazökar, ağır; soyuqqanlı; **to remain entirely ~** tamamilə soyuqqanlı qalmaq

**self-possession** ['selfpə'zeʃn] *n* təmkinlilik, soyuqqanlılıq, səbir, dözüm, özünü saxlama/itirməmə; **to lose *one's* ~** təmkinini/səbrini /dözümünü itirmək; **to regain *one's* ~** təmkinini/soyuqqanlılığını saxlamaq
**self-praise** ['self'preɪz] *n* özünü öymə/tərifləmə, öyünmə, lovğalanma
**self-preservation** ['self.prezə'veɪʃn] *n* özünü qoruma/ mühafizə etmə/saxlama; **the instinct of ~** özünü qoruma/ mühafizə etmə instinkti
**self-profit** ['self'prɔfɪt] *n* şəxsi mənfəət
**self-recording** ['selfrɪ'kɔ:dɪŋ] *adj* özü qeyd edən, özü yazan
**self-regard** ['selfrɪ'gɑ:d] *n* özü haqqında və öz mənfəəti haqqında qayğı, özünəqayğı
**self-reliance** ['selfrɪ'laɪəns] *n* özünə inam/inanma, öz gücünə arxalanma
**self-reliant** ['selfrɪ'laɪənt] *adj* özünə/öz gücünə arxalanan, özünə inanan; **a ~ person** özünə arxalanan adam
**self-reproach** ['selfrɪ'proutʃ] *n* **1**. özünü qınama; **2**. vicdan əzabı
**self-respect** ['selfrɪs'pekt] *n* özünə hörmət, özünə hörmət etmə; **to lose all ~** özünə hörməti tamam itirmək, özünə hörmət etməmək/qoymamaq
**self-respectful** ['selfrɪs'pektfl] *adj* özünə hörmət edən, öz ləyaqətini saxlayan/gözləyən
**self-restrained** ['selfrɪs'treɪnd] *adj* təmkinli, səbirli, özünü/nəfsini saxlaya bilən
**self-sacrifice** ['self'sækrɪfaɪs] *n* fədakarlıq, özünü qurban vermə, canından keçmə
**self-satisfaction** ['self.sætɪs'fækʃn] *n* özünü bəyənmə, təkəbbür, məğrurluq; arxayınçılıq, qayğısızlıq
**self-satisfied** ['self'sætɪsfaɪd] *adj* özündən razı, özünübəyənən, öz nöqsanını görməyən, özünü başqasından üstün tutan; arxayın, qayğısız
**self-scorn** ['self'skɔ:n] *n* özünə nifrət
**self-seeker** ['self'si:kəʳ] *n* tamahkar/mənfəətpərəst adam, vəzifəpərəst, mənsəbpərəst, karyerist
**self-seeking**[1] ['self'si:kɪŋ] *n* vəzifəpərəstlik, mənsəbpərəstlik, karyerizm
**self-seeking**[2] ['self'si:kɪŋ] *adj* tamahkar, mənfəətpərəst, xudbin, eqoist
**self-service**[1] ['self'sə:vɪs] *n* özünəxidmət, özözünə qulluq etmə/baxma
**self-service**[2] ['self'sə:vɪs] *adj* özünəxidmət; **a ~ store** özünəxidmət mağazası
**self-sufficient** ['selfsə'fɪʃnt] *adj* **1**. müstəqil, sərbəst, asılı olmayan; **2**. özünə güvənən/qürrələnən, lovğa, saymaz
**self-sufficing** ['selfsə'faɪsɪŋ] *adj* **1**. müstəqil, sərbəst, asılı olmayan; **2**. özünə güvənən/qürrələnən, lovğa, saymaz
**self-taught** ['self'tɔ:t] *adj* öz-özünə öyrənmiş, özü öyrənmiş; **a ~ painter** öz-özünə öyrənmiş rəssam
**self-teacher** ['self'ti:tʃəʳ] *n* öz-özünə təhsil almaq üçün dərs kitabı
**self-will** ['self'wɪl] *n* tərslik, inad, inadkarlıq, inadcıllıq, kəclik
**self-willed** ['self'wɪld] *adj* tərs, inad, inadkar, inadcıl, özbaşına, kefi istədiyini/öz bildiyini edən; **a ~ child** tərs/inad/kefi istədiyini edən uşaq
**sell**[1] [sel] *n* **1**. *d.d.* ümidsizlik, ümidi kəsilmə/boşa çıxma, məyus olma; əfsus; heyf, peşmançılıq, pərtlik; *What a sell! Çox heyf! We were late for the dinner which was a sell Çox heyf ki, biz nahara gecikdik*; **2**. *amer. d.d.* yalan, aldatma, hiylə, kələk, fırıldaq; *It was just a sell Bu sadəcə olaraq hiylə/kələk/fırıldaq idi*; **3**. alver etmə bacarığı/məharəti
**sell**[2] [sel] *v (pt, pp* **sold** [sould]) **1**. satmaq; **to ~ a book/a house/a horse** kitab/ev/at satmaq; **to ~ dear/cheap** baha/ucuz satmaq; **to ~ at a loss** ziyanına satmaq; **to ~ oneself** özünü satmaq *(xüs. qadınlar haq.)*; **2**. satılmaq; **to ~ well/easily** yaxşı/asan satılmaq; **to ~ badly/hard/heavily** pis/ağır/çətin satılmaq; *This book is selling well Bu kitab yaxşı satılır; Goods of that quality will never sell Bu keyfiyyətli mallar heç vaxt satılmayacaq; Tennis balls sell best in summer Tennis topları ən yaxşı yayda satılır*; **to ~ like hot cakes/like wildfire** əlüstü/dərhal satılmaq; *Which books sell best Hansı kitablar ən yaxşı satılır?*; **3**. satışa kömək etmək; *Good advertising will sell goods Yaxşı reklam malların satılmasına kömək edir*; **4**. satmaq *(vətəni və s.)*; **to ~ *one's* country** vətənini satmaq; **to ~ a match** rüşvət alıb yarışı uduzmaq; **5** *(adət.* **on)** *amer. d.d.* təlqin etmək *(fikri)*, tovlamaq, inandırmaq; *He was sold on this idea Onu bu fikrə inandırdılar; I don't expect to sell anything to anyone Mən heç vaxt heç kəsi inandırmağa çalışmıram*; **6**. *d.d.* yayılmaq, intişar tapmaq; *Do you think the idea will sell? Sən/Siz bu fikrin intişar tapacağına güman edirsənmi?/edirsinizmi?*; **to ~ off 1)** satıb qurtarmaq/sovmaq; **to ~ off *one's* possessions** öz əmlakını satıb sovmaq; **2)** güzəştlə/ucuz qiymətə satmaq; **to ~ out** satmaq, ləğv etmək *(firmanı); He sold out his share of the business and retired O, firmada öz payını satdı və azad oldu; The edition is sold out Nəşrin tirajı satılıb qurtardı*; **to ~ up** hərraca qoyulmaq; *He went bankrupt and was sold up O, müflisləşdi və əmlakı hərraca qoyuldu*;
◊ **to ~ *one's* life dearly** həyatını baha satmaq; **to ~ short 1)** əldə olmayan malı və ya qiymətli kağızları vaxtında satmaq *(birjada)*; **2)** aldatmaq, pis vəziyyətdə qoymaq; *They were sold short Onları pis vəziyyətdə qoydular*
**seller** ['seləʳ] *n* **1**. satıcı, alverçi; **2**. tezsatılan mal /kitab; **a good/poor ~** yaxşısatılan/pissatılan kitab;



◊ **~'s market** *iqt.* tələbin təklifi üstələdiyi bazar; **~s' prices** *iqt.* satıcıya xeyirli/xeyir verən qiymətlər, yüksək qiymətlər
**selling**[1] ['selɪŋ] *n* satma, satılma; satış, satılış; *He was entrusted with the selling of... Ona ... satışını etibar etdilər*; **to rush into heavy ~** çətin/ağır satılmaq
**selling**[2] ['selɪŋ] *adj* satış, satma; **a ~ agent** satış müvəkkili/agenti; **~ price** satış qiyməti
**selvage** ['selvɪdʒ] *n* haşiyə, kənar
**-selves** [selvz] *qayıdış əvəzliklərində işlənən* **self** *suffiksinin cəm forması*; **ourselves, themselves**
**semantic** [sɪ'mæntɪk] *adj dilç.* semantik, mənaca, mənaya görə, məna baxımından; **~ analysis of a word** sözün semantik/mənaca/məna baxımından təhlili
**semantics** [sɪ'mæntɪks] *n dilç.* semantika
**semaphore**[1] ['seməfɔ:ʳ] *n* semafor
**semaphore**[2] ['seməfɔ:ʳ] *adj* semafor; **a ~ signal** semafor siqnalı; **a ~ lamp** semafor lampası
**semaphore**[3] ['seməfɔ:ʳ] *v* semafor vasitəsilə siqnal göndərmək/xəbər vermək
**semasiological** [sɪ.meɪsɪə'lɔdʒɪkl] *adj dilç.* semasiologiya, semasioloji
**semasiologist** [sɪ.meɪsɪ'ɔlədʒɪst] *n* semasioloq, semasiologiya ilə məşğul olan dilçi
**semasiology** [sɪ.meɪsɪ'ɔlədʒɪ] *n dilç.* semasiologiya
**semblance** ['sembləns] *n* **1**. oxşayış, oxşarlıq, bənzəmə, bənzəyiş; **a feeble ~** zəif bənzəmə/bənzəyiş/ oxşarlıq/ oxşayış; **2**. xarici/zahiri görkəm, sima; **to bear the ~ of an angel and the heart of a devil** simaca mələk, qəlbən isə şeytan olmaq; mələk simalı, şeytan qəlbli olmaq; **3**. surət, görkəm; **in the ~ of a serpent** ilan surətində/görkəmində; **to put on a ~ of anger/gaiety** özünü hirsli/şən göstərmək
**semeiology** [.si:maɪ'ɔlədʒɪ] *n dilç.* semiologiya
**semi-** ['semɪ-] *mürəkkəb nitq hissəsi düzəldən prefiks; Azərbaycan türkcəsində əsasən* **yarım-** *komponentinə uyğun gəlir*: **semi-annual yarımillik**; **semi-monthly yarımaylıq**; **semifinal yarımfinal**
**semi-annual**[1] ['semɪ'ænjuəl] *n* yarım ildə bir dəfə çıxan dövri nəşr
**semi-annual**[2] ['semɪ'ænjuəl] *adj* yarımillik, yarım ildə bir dəfə çıxan *(jurnal və s.)*
**semi-centennial** ['semɪsen'tenjəl] *adj* yarıməsrlik, əlli ildə bir dəfə baş verən
**semicircle** ['semɪ.sə:kl] *n* yarımdairə, qövs; qövsşəkilli xətt
**semicircular** ['semɪ'sə:kjuləʳ] *adj* yarımdairəvi, yarım dairə şəkilli/formalı; **a ~ flower-bed** yarımdairəvi/ yarımdairəvi şəkilli gül ləki
**semicolon** [.semɪ'koulən] *n* nöqtəli vergül
**semi-conductor** [.semɪkən'dʌktəʳ] *n fiz.* yarımkeçirici
**semi-conscious** [.semɪ'kɔnʃəs] *adj* yarımhuşsuz; *An elderly woman was found semi-conscious on the floor of her kitchen Yaşlı bir qadın yarımhuşsuz halda mətbəxinin döşəməsində tapıldı*
**semidocumentary** ['semɪ.dɔkju'mentrɪ] *adj* yarımsənədli; **a ~ film** yarımsənədli film
**semifinal**[1] ['semɪ'faɪnl] *n id.* yarımfinal, yarımfinal oyunu
**semifinal**[2] ['semɪ'faɪnl] *adj id.* yarımfinal; **~ match** yarımfinal yarışı
**semifinalist** [.semɪ'faɪnəlɪst] *n id.* yarımfinalçı, yarımfinala çıxmış idmançı
**semifinished** ['semɪ'fɪnɪʃt] *adj*: **~ product** yarımfabrikat *(sonradan başqa istehsalatda işlənib tamamlanmalı olan məmulat)*
**semifluid** ['semɪ'fluɪd] *n kim.* yarımmaye
**seminar**[1] ['semɪna:ʳ] *n* seminar; **a one-day ~** bir günlük seminar
**seminar**[2] ['semɪna:ʳ] *adj* seminar; **a ~ room** seminar otağı; **a ~ library** seminara xidmət edən kitabxana
**seminarist** ['semɪnərɪst] *n* **1**. seminar üzvü; **2**. seminariya tələbəsi; seminariya qurtarmış adam
**seminary** ['semɪnərɪ] *n* **1**. seminariya *(xüsusi orta məktəb)*; **a ~ for young ladies** əsilzadə gənc xanımlar üçün məktəb/institut; **2**. ruhani seminariyası; **3**. şitillik
**semiotics** [.semɪ'ɔtɪks] *n* **1**. *dilç.* semiotika *(işarələr və işarə sistemi haqqında elm)*; **2**. *tib.* semiotika *(xəstəliklərin əlamətlərindən bəhs edən elm)*
**Semitic** [sə'mɪtɪk] *adj* semit; **~ languages/peoples** semit dilləri/xalqları
**semi-vowel** ['semɪvauəl] *n* yarımsait
**semolina** [.semə'li:nə] *n* yarma; manna yarması
**senate**[1] ['senət] *n* **1**. senat; **2**. elmi sovet *(universitetlərdə)*
**senate**[2] ['senət] *adj* senat; **a Senate decision** senat qərarı
**senator** ['senətəʳ] *n (qısa forması* **Sen**) senat, senat üzvü
**senatorial** [.senə'tɔ:rɪəl] *adj* **1**. senator; **~ rank** senator rütbəsi; **~ powers** senator səlahiyyətləri; **2**. *amer.* senator seçkisində iştirak etmək hüququna malik/ixtiyarı olan; **~ district** senator seçən rayon/bölgə
**senatorship** ['senətəʃɪp] *n* **1**. senator rütbəsi/adı; **2**. senatorun səlahiyyət müddəti
**send** [send] *v (pt, pp* **sent** [sent]) **1**. göndərmək, yola salmaq; **to ~ a letter/a telegram/document/information** məktub/teleqram/sənəd /məlumat göndərmək; **to ~ a child to school** uşağı məktəbə göndərmək; *He has sent his boy to school O, oğlunu məktəbə göndərib; His mother sent him to the bakery to get some bread Anası onu çörək almaq üçün çörək dükanına göndərdi; We've sent him a letter, We've sent a letter to him Biz ona məktub göndərmişik*; **2**. gətirmək, salmaq *(müəyyən vəziyyətə)*; **to ~ *smb.* mad** bir kəsi dəli etmək/vəziyyətinə salmaq; **to ~ *smb.* to sleep** bir kəsi yatırmaq/yu-

xuya vermək; **to ~ away** 1) qovmaq; 2) göndərmək; **to ~ away for** ***smth***. bir şey üçün göndərmək; **to ~ down** 1) aşağı salmaq, azaltmaq; **to ~ down prices** qiymətləri aşağı salmaq; **to ~ down the temperature** temperaturu azaltmaq/aşağı salmaq; 2) kənarlaşdırmaq, çıxartmaq *(universitetdən, kollecdən)*; **to ~ forth** 1) buraxmaq, atmaq; *Plants send forth root Bitkilər kök buraxır/atır; The sun sends forth light and heat Günəş şüa və istilik buraxır*; 2) göndərmək; **to ~ forth labourers into the harvest** işçiləri məhsul yığmağa göndərmək; **to ~ off** 1) göndərmək, yola salmaq *(bağlamanı, məktubu və s.)*; **to ~ off** ***one's*** **luggage** yükünü/baqajını göndərmək; 2) qovmaq, işdən çıxartmaq; 3) yola salmaq; **to ~ out** 1) vermək; *A stove sends out heat Soba/Peç istilik verir; A lamp sends out light Lampa işıq verir;* 2) atmaq, vermək *(kök, zoğ, cücərti); The tree sends out leaves Ağaclar yarpaqlayır*; 3) göndərmək; **to ~ out invitation** dəvətnamə göndərmək; **to ~ up a report** hesabat göndərmək; **to ~ out a signal** siqnal göndərmək; **to ~ up** qaldırmaq, yüksəltmək; **to ~ up prices** qiymətləri qaldırmaq;

◊ **to ~ word to** ***smb***. məlumat vermək; *Send me word of your arrival Gəlməyin/Gəlməyiniz haqqında/barədə mənə məlumat ver/verin; God send you better health! Allah səni/sizi saxlasın, Allah canına/canınıza sağlıq versin*

**sender** ['sendə$^{r}$] *n* 1. göndərən; **the ~ of the letter/telegram** məktubu/teleqramı göndərən; 2. ekspeditor *(mal və s. göndərməklə məşğul olan işçi)*; 3. radioverici aparat

**senescence** [sı'nesns] *n* qocalma, qocalıb əldən düşmə/ zəifləmə

**senile** ['si:naıl] *adj* qocalıq, qocalara xas olan; zəif, gücsüz, taqətsiz, qocalıb əldən düşmüş; **~ imbecility** qocalıq düşkünlüyü; **~ disease** qocalıq xəstəliyi

**senility** [sı'nılıtı] *n* qocalıq; zəiflik, gücsüzlük, taqətsizlik; **premature ~** vaxtından əvvəl qocalıq

**senior**[1] ['si:njə$^{r}$] *n* 1. böyük; **to have respect for** ***one's*** **~s** böyüklərinə hörmət etmək; 2. böyük, yuxarı *(vəzifəcə, rütbəcə)*; **to be** ***smb.'s*** **~ by three years** bir kəsdən üç yaş böyük olmaq; **to be a ~ at high school** orta məktəbin yuxarı sinif şagirdi olmaq; 3. yuxarı kurs tələbəsi; 4. *amer*. orta məktəb müdavimi; 5. *amer*. son kurs tələbəsi

**senior**[2] ['si:njə$^{r}$] *adj* 1. ata; *John Brown senior was a busy man Ata Con Braun məşğul adam idi*; 2. böyük *(yaşca, mövqecə)*; **the ~ members of the family** ailənin böyük/yaşlı üzvləri; **to be several years ~ to** ***smb***. bir kəsə görə bir neçə yaş böyük olmaq; 3. yaşlı; **~ members of a club** klubun yaşlı üzvləri; 4. yuxarı; **~ classes** yuxarı siniflər; **~ pupils** yuxarı sinif şagirdləri; **~ students** yuxarı kurs tələbələri;

◊ **~ man** yuxarı kurs tələbəsi

**seniority** [.si:nı'ɔrıtı] *n* 1. yaşa/staja/vəzifəyə /rütbəyə görə böyüklük; **in order of ~** böyüklüyə görə; 2. iş stajı

**senor** [se'njɔ:$^{r}$] *n (pl həm də* **-res** [-reıs]) senyor *(ispan dilində kişiyə müraciət forması)*

**senora** [se'njɔ:rə] *n* senyora *(ispan dilində qadına müraciət forması)*

**senorita** [.senjɔ:'rıtı] *n* senyorita *(ispan dilində qıza müraciət forması)*

**sensate**[1] ['sensıt] *adj* hiss olunan/edilən

**sensate**[2] ['senseıt] *v* duymaq, hiss etmək

**sensation** [sen'seıʃn] *n* 1. duyğu, hiss; **pleasant ~** xoş/xoşa gələn hiss; **disagreable ~** xoşa gəlməyən/ikrah doğuran hiss; **a ~ of pain** ağrı hissi; **~ of fear/of weariness** qorxu/yorğunluq hissi; **to lose all ~ of feeling in** ***one's*** **feet** ayaqlarında bütün hissi itirmək; **a ~ of touch** lamisə duyğusu, toxunma hissi; 2. qavrayış, qavrama, dərk etmə; **visible ~** görmə qavrayışı; 3. sensasiya; **the greatest ~** ən böyük sensasiya; **to make/to create/to cause a ~** sensasiya yaratmaq

**sensational** [sen'seıʃnl] *adj* 1. sensasiyalı, sensasiya doğuran, gurultulu; **~ news/rumours** sensasiya doğuran xəbərlər/şayiələr; **a ~ crime** sensasiya doğuran cinayət; **~ victory** gurultulu qələbə; 2. çox gözəl/qəşəng/yaxşı; dəbdəbəli, təntənəli; **~ play** çox gözəl/yaxşı pyes; *She looks sensational in this dress O bu paltarda çox gözəl görünür*; 3. hiss edilən, duyulan, hisslərə əsaslanan; 4. *fəls*. sensual, hissi; subyektiv hissə/duyğuya əsaslanan

**sensationalism** [sen'seıʃnəlızm] *n* 1. gurultululuq, həyəcanlılıq, fövqəladəlik, gurultu/ həyəcan qaldırma, çox böyük təsir oyatma məqsədi güdmə; 2. *fəls*. sensualizm *(idrakın yeganə mənbəyi duyğular olduğunu iddia edən fəlsəfi cərəyan)*

**sensationalist** [sen'seıʃnəlıst] *n fəls*. sensualist *(sensualizm tərəfdarı)*

**sensationalize, -ise** [sen'seıʃənəlaız] *v* həyəcanlandırmaq, həyəcana gətirmək/salmaq, həyəcan oyatmaq

**sensationally** [sen'seıʃnəlı] *adv* 1. sensasiya doğuracaq tərzdə; son dərəcə; *He is sensationally rich O son dərəcə varlıdır*; 2. ehtirasla, ehtiraslı bir tərzdə

**sense**[1] [sens] *n* 1. duyğu, hiss; **the five ~s** beş duyğu; **~ of hearing/of sight/of smell/of taste/of touch** eşitmə/görmə/iybilmə/dadbilmə/lamisə duyğusu; **sixth ~** altıncı duyğu, intuisiya *(sezmə, ürəyə damma)*; **inner ~** daxili hiss etmə, daxildən gələn səda; 2. hiss etmə, duyma; dərk etmə; qavrama; **a ~ of pain** ağrı hissi; **a ~ of time** zamanı/vaxtı hiss etmə; **a ~ of locality** məkanı hiss etmə/qavrama; **a high ~ of duty** yüksək vəzifə hissi; **a keen ~ of humour** iti yumor hissi; **to lack all ~ of beauty/of justice** gözəllik/ədalət hissini itirmək; 3. *pl* şüur,



düşüncə; **to be out of** ***one's*** **~s** *d.d.* ağlı başında olmamaq, dəli olmaq, başına hava gəlmək; 4. *d.d.* ağıl, dərrakə, idrak; **to bring** ***smb***. **to his ~s** bir kəsi ağıllandırmaq, bir kəsin başına ağıl qoymaq; **to come to** ***one's*** **~s** ağıllanmaq, ağlı başına gəlmək; 5. sağlam ağıl/düşüncə; **a man of ~** ağıllı/sağlam düşüncəli adam; **to show good ~** sağlam düşüncə nümayiş etdirmək; **to talk ~** ağıllı/düşüncəli danışmaq; **to have the ~ to do** ***smth***. bir şeyi etmək üçün kifayət qədər ağıla malik olmaq; **to make use of** ***one's*** **~** *d.d.* fikirləşmək, başını işlətmək; 6. məna; **~ of a word/a sentence** sözün/cümlənin mənası; **strict/literal ~** dəqiq/hərfi məna; **archaic ~** arxaik məna; **in the narrow ~ of the word** sözün dar mənasında; **to have/to make ~** mənası olmaq; **to have no ~** mənası olmamaq, mənasız olmaq; 7. ümumi əhval-ruhiyyə/ovqat; ruh; **to take the ~ of the meeting** iclasın ruhunu müəyyənləşdirmək *(səsə qoyma yolu ilə)*; 8. istiqamət; **~ of rotation/of current** fırlanmanın/cərəyanın istiqaməti

**sense**[2] [sens] *v* 1. hiss etmək, duymaq, anlamaq; *He sensed our hostility O bizim düşmənçiliyimizi hiss etdi*; 2. başa düşmək, dərk etmək; *She fully sensed the danger of her position O öz vəziyyətinin təhlükəsini tam başa düşdü/dərk etdi*

**senseless** ['senslıs] *adj* 1. huşsuz; **to be/to lie ~** huşsuz olmaq/uzanmaq; **to fall ~** bihuş halda/ölü kimi yıxılmaq; 2. rəhmsiz, daşürəkli; qəddar, amansız; **a ~ brute** daşürəkli/qəddar yaramaz; 3. mənasız; axmaq, sarsaq; **~ idea** mənasız/axmaq fikir; **~ custom** axmaq/sarsaq adət

**sensibility** [.sensı'bılıtı] *n* 1. həssaslıq; **the ~ of the skin** dərinin həssaslığı; **the ~ of the magnetic needle** maqnit əqrəbinin həssaslığı; 2. qavrama/dərk etmə qabiliyyəti; **fine ~** yüksək qavrama/dərk etmə qabiliyyəti; **blunt/ acute ~** pis/iti qavrama qabiliyyəti; 3. *pl* küsəyənlik, tez küsmə/incimə/sınma; **to wound/to offend** ***smb.'s*** **sensibilities** bir kəsi küsdürmək/incitmək/pərt etmək

**sensible** ['sensəbl] *adj* 1. ağıllı, səmərəli, mənalı, ağlabatan, məntiqi; dərrakəli; **~ idea** ağıllı/ mənalı/ağlabatan fikir; **~ suggestion** ağıllı/səmərəli təklif; **a ~ rule** ağıllı/səmərəli qayda; **a ~ person** dərrakəli/ ağıllı adam; *It was sensible of you to lock the door Ağıllılıq edib qapını bağladın/bağladınız*; 2. görünən, gözə çarpan, gözəgörünən, aşkar, aydın; hiss olunan, duyulan, əhəmiyyətli, nəzəri cəlb edən; **~ increase** gözəçarpan/ hiss olunan/duyulan artım; **a ~ increase in temperature** temperaturda aşkar/duyulan/hiss olunan artım; 3. anlayan, dərk edən, başa düşən; **to be ~ of** ***smth***. bir şeyi anlamaq/başa düşmək/ dərk etmək; *Are you sensible of the danger of your position? Sən/Siz vəziyyətinin/ vəziyyətinizin təhlükəliliyini dərk edirsənmi?/ edirsinizmi?*; 4. huşu üstündə, ağlı başında; *The injured man was still sensible Yaralanmış kişi hələ də huşunu itirməmişdi*; 5. həssas, dəqiq *(cihaz və s. haq.)*; **~ balance** dəqiq tərəzi

**sensibly** ['sensəblı] *adv* 1. ağıllı, düşünərək, ağıl ilə, məntiqlə; səmərəli surətdə/tərzdə; **to dress ~** ağıllı/ düşünərək geyinmək; **to act ~** ağıllı/məntiqli hərəkət etmək

**sensitive** ['sensıtıv] *adj* 1. zərif, həssas, tez mütəəssir olan, ürəyi nazik/yuxa; **~ skin** zərif /həssas dəri; **~ ear** həssas qulaq; **~ to heat/to light/to cold** istiyə/işığa/soyuğa həssas; **a ~ person** həssas/tez mütəəssir olan adam; *Photographic paper is highly sensitive Fotokağız çox həssasdır*; 2. küsəyən, tez küsən/inciyən, dəymədüşər; **a ~ child** küsəyən uşaq; 3. dəqiq; **a ~ pair of scales** dəqiq tərəzi

**sensitively** ['sensıtıvlı] *adv* həssaslıqla, mütəəssir bir surətdə, səmimiyyətlə, nəvazişlə, sevə-sevə

**sensitivity** [.sensı'tıvıtı] *n* həssaslıq; tez mütəəssir olma, ürəyi naziklik/yuxalıq; **~ to pain /light /heat/cold** ağrıya/işığa/istiyə/soyuğa həssaslıq; **the ~ of a writer** yazıçının həssaslığı; **lack of ~** həssaslığın olmaması, kütlük

**sensitize, -ise** ['sensətaız] *v* həssaslaşdırmaq, həssaslığı artırmaq/yüksəltmək

**sensor** ['sensə$^{r}$] *n* göstərici cihaz

**sensory** ['sensərı] *adj* həssas; **~ organs** həssas üzvlər *(bədəndə)*

**sensual** ['senʃuəl] *adj* 1. duyulan, hiss edilən, duyğu orqanları ilə qavranılan; cismani, şəhvani; ehtiraslı; **~ pleasure** cismani/şəhvani ləzzət; **~ life** cinsi həyat; 2. şəhvətli, ehtiraslı

**sensualism** ['sensjuəlızm] *n* 1. həssaslıq; tez mütəəssir olma; 2. *fəls*. sensualizm *(idrakın yeganə mənbəyinin duyğular olduğunu iddia edən fəlsəfi cərəyan)*

**sensualist** ['sensjuəlıst] *n* 1. şəhvətpərəst *(adam)*; 2. *fəls*. sensualist *(sensualizm tərəfdarı)*

**sensuality** [.sensju'ælıtı] *n* 1. duyma qabiliyyəti, duyğu orqanları ilə qavranıla bilmə; 2. şəhvət, ehtiras, şəhvətpərəstlik

**sensuous** ['senʃuəs] *adj* şəhvətli, ehtiraslı; **a ~ woman** ehtiraslı/şəhvətli qadın; **~ lips** ehtiraslı/ehtiras doğuran dodaqlar

**sensuously** ['senʃuəslı] *adv* ehtirasla, şəhvətlə, ehtiraslı bir tərzdə

**sensuousness** ['senʃuəsnıs] *n* ehtiras, ehtiraslılıq, şəhvət, şəhvətlilik

**sent** [sent] **to send** *felinin pt və pp formaları*

**sentence**[1] ['sentəns] *n* 1. *qram*. cümlə; **to construct a ~** cümlə qurmaq; **a declarative ~** nəqli cümlə; **an interrogative/an imperative ~** sual/əmr cümləsi; 2. *hüq*. hökm, qərar; cəza; **nominal /suspended ~** şərti cəza; **severe /lenient ~** ciddi/yumşaq hökm; **capital/ death ~, ~ of death** ölüm hökmü/cəzası; **to get a life ~** ömürlük həbs cəzası almaq; **to pass/to pro-**

**nounce a** ~ hökm çıxartmaq; **to reverse/to recall a** ~ hökmü ləğv etmək

**sentence**[2] ['sentəns] *v* iş/cəza kəsmək, məhkum etmək, hökm vermək; **to** ~ ***smb.*** **to death** bir kəsi ölümə məhkum etmək, bir kəs haqqında ölüm hökmü çıxartmaq; **to** ~ **a thief to six months' imprisonment** oğruya altıaylıq həbs cəzası vermək/kəsmək; *He was sentenced to three years in prison Ona üç il həbs cəzası verdilər*

**sententious** [sen'tenʃəs] *adj* əxlaqi, nəsihətli, ibrətli; ~ **phrases** ibrətli ifadələr/cümlələr; ~ **sayings** hikmətli sözlər/aforizmlər

**sententiously** [sen'tenʃəslı] *adv* **1.** təmtəraqla, ibarə/ təntənə ilə; **to speak** ~ təmtəraqla danışmaq; **2.** nəsihətamiz tərzdə, nəsihətamizcəsinə

**sentiment** ['sentımənt] *n* **1.** hiss, duyğu; sevgi, məhəbbət; **patriotic** ~**s** vətənpərvərlik hissləri/duyğuları; **lofty** ~**s** yüksək/ali hisslər; **family** ~**s** ailə sevgiləri/məhəbbəti; **a** ~ **of pity** şəfqət /mərhəmət/rəhm hissi; **2.** sentimentalist *(sentimentalizm tərəfdarı olan yazıçı)*; **3.** *əsasən pl* fikir, rəy, münasibət, ovqat; **public** ~**s** ictimai fikir/rəy; **to express** ***one's*** ~**s** fikrini/rəyini söyləmək; **to change** ***one's*** ~**s** fikrini/rəyini dəyişmək

**sentimental** [,sentı'mentl] *adj* **1.** həssas, nazikürəkli, incəqəlbli; sentimental; ~ **music/poetry** sentimental musiqi/poeziya; **2.** zərif, incə, məlahətli; zəif; ~ **whisper** zərif/zəif pıçıltı

**sentimentalism** [,sentı'mentəlızm] *n* sentimentalizm *(XIX əsrdə Avropa ədəbiyyatında meydana gəlmiş ədəbi cərəyan)*

**sentimentalist** [,sentı'mentəlıst] *n* **1.** sentimentalist *(sentimentalizm tərəfdarı olan yazıçı)*; **2.** sentimental adam

**sentimentality** [,sentımen'tælıtı] *n* sentimentallıq, həssaslıq, nazikürəklilik, incəqəlblilik; sentimental hərəkətlər/söhbətlər

**sentimentalize, -ise** [,sentı'mentəlaız] *v* həddən artıq həssaslıq/aliconablıq/yumşaqlıq göstərmək

**sentimentally** [,sentı'mentəlı] *adv* həssaslıqla, iltifatla, aliconablıqla

**sentinel**[1] ['sentınl] *n* növbətçi, qarovul; **to place/to station a** ~ növbətçi qoymaq; **to appoint a** ~ növbətçi təyin etmək

**sentinel**[2] ['sentınl] *v* **1.** qorumaq, mühafizə etmək; **2.** növbətçi/qarovul qoymaq

**sentry** ['sentrı] *n* növbətçi, keşikçi, qarovul; **a soldier on** ~ keşikçi/növbətçi əsgər; ~ **on guard** növbə çəkən keşikçi; **to post a** ~ növbətçi/keşikçi qoymaq; **to keep/to stand** ~ qorumaq, növbətçi/keşikçi/gözətçi olmaq, növbə/keşik çəkmək; **to carry/to relieve sentries** növbətçiləri dəyişdirmək

**sentry-box** ['sentrıbɔks] *n* növbətçi/keşikçi/gözətçi budkası

**sepal** ['sepəl] *n bot.* kasayarpaq

**separability** [,seprə'bılətı] *n* ayrıla bilmə, ayrılma qabiliyyəti, ayrılıq, müstəqillik

**separable** ['sepərəbl] *adj* ayrılan, ayrıla bilən; ayrı, müstəqil

**separably** ['sepərəblı] *adv* ayrı, ayrıca; **to live** ~ ayrı yaşamaq; *They are living now separably Onlar indi ayrı/ ayrıca yaşayırlar*

**separate**[1] ['sepərıt] *adj* **1.** ayrı, ayrı-ayrı, ayrıca, tək; təcrid edilmiş; **a** ~ **room** ayrı otaq; **to sleep in** ~ **beds** ayrı-ayrı/ayrıca çarpayıda yatmaq; *The children sleep in separate beds Uşaqlar ayrı-ayrı/ayrıca çarpayılarda yatırlar*; **2.** əlahiddə, müstəqil; *These are two entirely separate questions Bunlar tamamilə iki müstəqil məsələlərdir*

**separate**[2] ['sepəreıt] *v* **1.** ayırmaq, fərqləndirmək, əlaqəsini kəsmək; **to** ~ **religion from politics** dini siyasətdən ayırmaq; **to** ~ **truth from falsehood** həqiqəti yalandan ayırmaq/fərqləndirmək; **2.** bölmək; **to** ~ ***smth.*** **into parts/into classes** bir şeyi hissələrə/siniflərə bölmək; **3.** çeşidləmək, sortlara/növlərə ayırmaq; təmizləmək; **to** ~ **grain from chaff** *k.t.* taxılı samandan/ püfədən təmizləmək; **4.** fərqləndirmək; **to** ~ ***smb.*** **from** ***smb.*** bir kəsi bir kəsdən fərqləndirmək; **5.** ayrılmaq, tərk etmək, vidalaşıb/görüşüb ayrılmaq; *The friends didn't separate till midnight Dostlar gecə yarıya qədər ayrılmadılar*;
◊ **to** ~ **the sheep from the goat** yaxşını pisdən fərqləndirmək, yaxşını yamandan seçmək

**separated** ['sepəreıtıd] *adj* ayrılmış, ayrılan; **two towns** ~ **by a river** bir çayla ayrılan/ayrılmış iki şəhər

**separately** ['sepərıtlı] *adj* ayrı, ayrı-ayrı, ayrıca, tək, təkbaşına; **to live** ~ tək/təkbaşına/ayrıca yaşamaq

**separating** ['sepəreıtıŋ] *adj* ayıran; **a wall** ~ **the rooms** otaqları ayıran divar

**separation** [,sepə'reıʃn] *n* **1.** ayırma, ayrılma; **the** ~ **of Church and State** kilsəni dövlətdən ayırma, kilsənin dövlətdən ayrılması; **2.** ayrılıq; **after a long** ~ uzun ayrılıqdan sonra; **3.** çeşidləmə, sortlara/növlərə ayırma; **4.** *hüq.* ər-arvadın ayrı yaşaması, boşanma; **to get a** ~ **from** ***one's*** **husband** ərindən boşanmaq; **to get a** ~ **from** ***one's*** **wife** arvadını boşamaq; **5.** *fiz.* parçalanma; ~ **of isotopes** izotopların parçalanması; **6.** əsgərlikdən/ ordudan tərxis olunma

**separatism** ['sepərətızm] *n* separatizm, separatçılıq

**separatist** ['sepərətıst] *n* separatist, separatçı *(separatizm tərəfdarı)*

**separator** ['sepəreıtə^r] *n* separator *(1) bir maddəni başqasından ayırmaq üçün cihaz; 2) k.t. üzlü süddən qaymağı ayıran cihaz)*

**sepsis** ['sepsıs] *n tib.* sepsis *(qana düşmüş xəstəliktörədici mikroorqanizmlərlə bədənin zəhərlənməsi)*

**Sept** [sept] **September** *sözünün qısa forması:* **16 Sept 1990** 16 sentyabr 1990-cı il





**September**[1] [sep'tembə^r] *n (qısa forması:* **Sept***)* sentyabr

**September**[2] [sep'tembə^r] *adj* sentyabr; ~ **days** sentyabr günləri

**sequel** ['si:kwəl] *n* **1.** nəticə, yekun; **the** ~ **of** ***smth.*** bir şeyin nəticəsi; **in the** ~ nəticədə, yekunda; **2.** ardı, mabədi; **a** ~ **to a novel** romanın ardı

**sequence** ['si:kwəns] *n* **1.** ardıcıllıq; **chronological/ natural /usual** ~ **of** ***smth.*** bir şeyin xronoloji/təbii/adi ardıcıllığı; ~ **of seasons** fəsillərin ardıcıllığı; *There is no sequence in his arguments Onun arqumentlərində heç bir ardıcıllıq yoxdur*; **in** ~ dalbadal, bir-birinin dalınca/ ardınca; **2.** nəticə; **a** ~ **to** ***smth.*** bir şeyin nəticəsi; **3.** *qram.* uzlaşma; **the** ~ **of tenses** zamanların uzlaşması

**sequestrate** [sı'kwestreıt] *v hüq.* **1.** sekvest qoymaq, əmlakı siyahıya almaq; **2.** *hüq.* müsadirə etmək; **3.** ölmüş ərin əmlakından imtina etmək

**sequestration** [,si:kwes'treıʃn] *n* **1.** *hüq.* sekvestr *(hər hansı bir mülkün və ya malın dövlət tərəfindən müsadirə olunması)*; mülkün/əmlakın başını bağlamaq; **2.** *hüq.* mülkün/əmlakın başını bağlamaq üçün məhkəmə qərarı; **3.** müsadirə; **4.** *tib.* xəstəni təcrid etmə, karantin

**serenade**[1] [,serı'neıd] *n mus.* serenada

**serenade**[2] [,serı'neıd] *v mus.* serenada ifa etmək

**serene**[1] [sı'ri:n] *n* **1.** buludsuz/açıq səma; **2.** sakit dəniz; **3.** sakitlik, sükut; dinclik, asudəlik, asayiş

**serene**[2] [sı'ri:n] *adj* **1.** buludsuz, açıq, aydın, şəffaf; **a** ~ **sky** buludsuz/açıq/aydın səma; *The sky is serene today Bu gün səma buludsuzdur /açıqdır/aydındır*; **2.** sakit, dinc, rahat; ~ **old age** dinc/rahat qocalıq;
◊ *All serene! Hər şey qaydasındadır!*

**serenely** [sə'ri:nlı] *adv* **1.** aydın, parlaq, açıq; **2.** sakitcə, rahatca, dinc, sakit, arxayınca

**serenity** [sı'renıtı] *n* **1.** aydınlıq, parlaqlıq, şəffaflıq *(səma və s. haq.)*; **the** ~ **of the sky** səmanın aydınlığı/açıqlığı; **2.** sakitlik, dinclik, rahatlıq; **the** ~ **of old age** qocalığın dincliyi/rahatlığı

**serf** [sə:f] *n tar.* təhkimli kəndli; **the** ~**s** *top.i* təhkimli kəndlilər; **liberation of the** ~**s** təhkimli kədlilərin azad olunması/edilməsi

**serfdom** ['sə:fdəm] *n* təhkimçilik hüququ; **the abolition of** ~ təhkimçilik hüququnun ləğvi/ləğv edilməsi

**serfhood** ['sə:fhud] *n* = **serfdom**

**serge** [sə:dʒ] *n* I *toxuc.* sarja *(astarlıq parça)*

**serge** [sə:dʒ] *n* II *d.d. hərb.* serjant *(orduda və polisdə kiçik komandir adlarından biri)*

**sergeant** ['sa:dʒənt] *n hərb.* serjant

**serial**[1] ['sıərıəl] *n* **1.** dövri nəşr; **2.** bir neçə hissədən ibarət roman *(qəzet və ya jurnalda çap olunan/edilən)*; **3.** serial *(iki və daha çox seriyadan ibarət film)*

**serial**[2] ['sıərıəl] *adj* **1.** seriyalı, seriyalarla buraxılan/ istehsal olunmuş; ~ **production** seriyalı istehsalat; ~ **publication** seriyalarla buraxılan nəşr; ~ **catalogue** seriyalı kataloq; **a** ~ **number** seriyalı nömrə; **a** ~ **film** seriyalı film; **2.** sıra *(nömrə haq.)*; **3.** dövri, vaxtaşırı, dövrəşırı

**serialize, -ise** ['sıərıəlaız] *v* seriya ilə nəşr etmək

**serially** ['sıərıəlı] *adv* dövri, vaxtaşırı, dövri/vaxtaşırı olaraq

**seriation** [,sıərı'eıʃn] *n* seriyallıq; seriyalarla buraxılma/ istehsal etmə/olunma

**sericulture** ['serıkʌltʃə^r] *n* ipəkçilik, baramaçılıq; ipəkçilik təsərrüfatı

**sericulturist** ['serı'kʌltʃərıst] *n* ipəkçi, baramaçı; ipəkçilik/ baramaçılıq mütəxəssisi

**series** ['sıəri:z] *n* **1.** *(cəm formada dəyişmir)* sıra, cərgə; **a** ~ **of events/of victories** bir sıra hadisələr/qələbələr; **2.** silsilə, buraxılış, qrup; **the men of letters** ~ böyük yazıçılar silsiləsi; **to complete/to conclude a** ~ buraxılışı tamamlamaq/başa çatdırmaq

**serious** ['sıərıəs] *adj* **1.** ciddi, təmkinli; **a** ~ **worker** ciddi/təmkinli fəhlə; **to be** ~ **about** ***smth.*** bir şeyə ciddi yanaşmaq; **to become** ~ ciddiləşmək, təmkinli olmaq; **to look** ~ ciddi/təmkinli görünmək; **to give** ***smth.*** **a** ~ **thought** 1) bir şeyə ciddi fikir vermək; 2) bir şeyi ciddi qəbul etmək; **2.** dərin; ~ **mind** dərin zəka/ağıl; **3.** vacib; ~ **thought/matter** vacib fikir/məsələ; **4.** təhlükəli, təhlükə doğuran; ~ **illness/mistake** təhlükəli xəstəlik/ səhv

**seriously** ['sıərıəslı] *adv* **1.** ciddi, ciddiyyətlə, ciddi surətdə/olaraq; *He's seriously ill O, ciddi surətdə xəstədir*; **2.** təhlükəli, qorxulu, təhlükəli/qorxulu tərzdə

**seriousness** ['sıərıəsnıs] *n* ciddilik, ciddiyyət; təmkin; *Do you realize the seriousness of the situation Sən/Siz vəziyyətin ciddiliyini dərk edirsənmi?/edirsinizmi?*;
◊ **in all** ~ tam ciddiliklə

**sermon** ['sə:mən] *n* **1.** moizə, xütbə, vəz etmə; **a** ~ **on** ***smth.*** bir şey haqqında xütbə/vəz etmə; **2.** *məc.* nəsihət, öyüd, öyüd-nəsihət; **to deliver a** ~ nəsihət/öyüd vermək; *We had to listen to a long sermon from the manager about not wasting money Biz pulu havayı xərcləməmək haqqında menecerin uzun nəsihətinə qulaq asmalı olduq*

**sermonize, -ise** ['sə:mənaız] *v* öyrətmək, ağıl/ nəsihət/ öyüd/öyüd-nəsihət vermək

**serpent** ['sə:pənt] *n* **1.** ilan *(xüs. iri)*; **2.** bic/hiyləgər/iblis adam

**serpentine** ['sə:pəntaın] *adj* **1.** ilanabənzər, ilanaoxşar, ilan kimi, qıvrım; **2.** əyri-üyrü, dolanbac; **a** ~ **road** əyri-üyrü/dolanbac yol; **3.** bic, hiyləgər, satqın, iblis

**serpentry** ['sə:pəntrı] *n* **1.** ilan yetişdirilən yer; **2.** ilan kimi əyri-üyrülük

**serrated** [se'reıtıd] *adj* dişli, diş-diş; ~ **edges** diş-diş qıraq *(bıçağın tiyəsində və s.)*; **a knife with a** ~ **blade** diş-diş tiyəsi olan bıçaq; ~ **leaves** diş-diş yarpaqlar

**servant** ['sə:vənt] *n* 1. qulluqçu, xidmətçi; **domestic ~s** ev qulluqçuları; **the hotel ~s** mehmanxana xidmətçiləri; **to keep ~s** qulluqçular saxlamaq; 2. qulluqçu *(dövlət idarələrində)*; **a faithful ~** sadiq/etibarlı qulluqçu; **a ~ of the State** dövlət qulluqçusu; **railway company's ~s** dəmiryol şirkətinin qulluqçuları; 3. xadim; **a ~ of art** incəsənət xadimi; **to be the ~ of one's country** öz ölkəsinə xidmət/qulluq etmək

**serve**[1] [sə:v] *n id.* topu oyuna daxil etmə *(tennis/badminton oyununda)*; *Whose serve is it now? İndi topu oyuna kim daxil edəcək?*

**serve**[2] [sə:v] *v* 1. xidmət etmək/göstərmək; **to ~ customers** müştərilərə xidmət etmək/göstərmək; **to ~ one's country** vətəninə xidmət etmək; 2. işləmək; **to ~ in an office/in a shop/in the police** idarədə/ mağazada/ polisdə işləmək; **to ~ as a secretary/as a cook/as a judge** katib/aşpaz/hakim kimi işləmək; 3. hərbidə xidmət etmək; **to ~ in the army/in the navy** orduda/ dəniz donanmasında xidmət etmək; 4. xidmət/qulluq etmək; **to ~ badly/fast/slowly** pis /cəld/ ləng xidmət etmək; *This railway line serves a large district Bu dəmir yolu geniş/böyük bir rayona xidmət edir; This doctor serves a large area Bu həkim geniş əraziyə xidmət edir*; 5. təmin etmək; **to ~ a town with gas/with water/with electricity** şəhəri qaz-la/su ilə/elektriklə təmin etmək; 6. vermək *(süfrəyə)*, gətirmək *(yemək, içki)*, xidmət etmək *(restoranda və s.)*; **to ~ breakfast/dinner/supper** səhər yeməyi/nahar/şam yeməyi vermək; *Serve the coffee in the drawing-room Kofeni qonaq otağına gətir/ gətirin; Dinner is served! Nahar verilib; I was served with tea and cake Mənə çay və pirojna verdilər*; 7. yerinə yetirmək; xidmət/kömək etmək; **to ~ some useful purpose** hər hansı bir faydalı məqsədə xidmət etmək; **to ~ the cause of peace** sülh işinə xidmət etmək; 8. ödəmək, qane/kifayət etmək; **to ~ smb.'s need** bir kəsin ehtiyacını ödəmək; 9. topu oyuna daxil etmək *(tennis, badminton və voleybol oyunlarında)*; **to ~ well/badly** yaxşı/pis daxil etmək *(topu)*; *It's your turn to serve Topu oyuna daxil etmək sənin/sizin növbəndir/ növbənizdir*; 10. müddəti çəkmək/bitirmək/çəkib qurtarmaq *(cəza, xidmət və s. haq.)*; **to ~ a sentence** cəza müddətini çəkib qurtarmaq; *He served eight months in jail O, səkkizaylıq həbsxana cəzasını çəkib qurtardı*; 11. *d.d.* rəftar etmək; **to ~ smb. well/ ill/ tenderly** bir kəslə yaxşı/pis/nəzakətlə rəftar etmək; *She was served very cruelly Onunla çox qəddarcasına rəftar etdilər*; 12. *k.t.* cütləşdirmək *(heyvanları)*; **to ~ out** paylamaq; **to ~ out the soup to the boys** oğlanlara şorba paylamaq; **to ~ round** qonaqlara xidmət etmək;

◊ **to ~ a gun** topdan atəş açmaq; *It serves him right! Ona haqq olur!*; **to ~ up an old tale** ≅ köhnə sandıq/ palan içi tökmək

**server** ['sə:vər] *n* 1. podnos *(qab-qacaq üçün)*; 2. topu oyuna daxil edən oyunçu *(tennis, voleybol oyununda)*; 3. *kils.* din xadimi

**service**[1] ['sə:vıs] *n* 1. xidmət, qulluq; qulluq/xidmət etmə/ göstərmə; **to be in smb.'s ~** bir kəsə xidmət göstərmək; **to go into/to ~** xidmətçi işləmək; **to take ~ with smb./into one's ~** bir kəsi xidmətçi qəbul etmək; 2. iş; **domestic ~** ev işləri; **hard/fatiguing ~** çətin/yorucu iş; **to be out of ~** işsiz olmaq; **to go out of ~** işdən çıxmaq; **to reward smb. for his good/for his long ~** bir kəsi yaxşı/uzunmüddətli işinə görə mükafatlandırmaq; 3. xidmət; **telegraph/postal/telephone ~** teleqraf/ poçt/ telefon xidməti; **to restore normal train ~** normal dəmiryol xidmətini bərpa etmək; 4. xidmət etmə; **good/bad ~ at a hotel /at a restaurant** mehmanxanada/ restoranda yaxşı/pis xidmət etmə; **prompt ~** tez/cəld xidmət etmə; **to give customers prompt ~** müştərilərə tez/cəld xidmət göstərmək; 5. hərbi xidmət; **to be called up for active ~** həqiqi hərbi xidmətə çağırılmaq; **to do one's military ~** hərbi xidmət keçmək; **to be in the ~** hərbi xidmətdə olmaq; **length/period of ~** hərbi xidmətin müddəti; **fit for ~** hərbi xidmətə yararlı; **to be disabled for active ~** həqiqi hərbi xidmətə yararsız olmaq; **to be dismissed/discharged from the ~** hərbi xidmətdən tərxis olunmaq; 6. xidmət, kömək; **to be at smb.'s ~** bir kəsin xidmətində olmaq; *I'm at your service Mən sənin/sizin xidmətindəyəm/ xidmətinizdəyəm*; **to offer one's ~s** öz xidmətini təklif etmək; **to be of ~ to smb.** bir kəsin karına/köməyinə gəlmək; **to do/to render smb. a ~** bir kəsə kömək/ xidmət göstərmək; *He rendered us a great service O bizə böyük xidmət göstərdi*; **to need the ~ of smb.** bir kəsin xidmətinə ehtiyacı olmaq; *He didn't need the services of an interpreter Onun dilmancın xidmətinə ehtiyacı yox idi*; **great /immense /important ~** böyük/çox böyük/vacib xidmət; **to exaggerate one's own ~s** öz xidmətini şişirtmək; 7. dəst, servis; **dinner/tea ~** nahar/çay dəsti; 8. ləvazimat komplekti; **toilet ~** tualet ləvazimatı komplekti; 9. topu oyuna daxil etmə *(tennis oyununda)*; 10. *k.t.* cütləşmə, cütləşdirmə *(heyvanları)*

**service**[2] ['sə:vıs] *adj* 1. çağırış; **~ age** çağırış yaşı; 2. hərbçi; **~ families** hərbçi ailələri; 3. hərbi; **~ test** hərbi sınaq; **~ uniform** hərbi geyim/forma; **~ weapon** hərbi silah;

◊ **to have seen ~** uzun müddət istifadə olunmaq, köhnəlmək, dağılmaq, yırtılmaq *(paltar, ayaqqabı və s. haq.)*, çox işlənib xarab olmaq /yeyilmək; *My overcoat has seen long services Mənim paltom lap köhnəlib*

**service**[3] ['sə:vıs] *v* 1. xidmət etmək/göstərmək; qulluq etmək; *The town is well serviced by a number of local shops Bir sıra yerli mağazalar şəhərə yaxşı xidmət göstərir*; 2. təmir etmək; **to ~ a car/a washing-machine** maşını/paltaryuyan maşını təmir etmək; 3. tökmək *(yanacaq)*; **to ~ a car with gasoline** maşına benzin tökmək



**serviceable** ['sə:vısəbl] *adj* 1. möhkəm; davamlı; **~ fabric/shoes/gloves** möhkəm parça/ayaqqabı/əlcək; 2. xeyirli, faydalı; **~ reminder** faydalı xatırlatma/yada salma; 3. saz, istismara yararlı

**serviceableness** ['sə:vısəblnıs] *n* 1. möhkəmlik, davamlılıq; 2. xeyirlilik, faydalılıq

**serviceman** ['sə:vısmən] *n (pl* **-men** [-mən]) 1. *hərb.* qulluqçu; 2. səfərbərliyə alınmış əsgər; 3. təlimatçı

**service parts** ['sə:vıs'pa:ts] *n tex.* ehtiyat hissələr

**servicewoman** ['sə:vıs,wumən] *n (pl* **-women** [-,wımın]) hərbi qulluqçu *(qadın)*

**servient** ['sə:vıənt] *adj* tabe edilmiş/olan, asılı, asılı olan

**serviette** [,sə:'vıet] *n* salfet, əlsilən; **paper ~** kağız salfet/əlsilən

**servile** ['sə:vaıl] *adj* 1. qul, kölə; **~ revolt** qul üsyanı/ qiyamı; **~ class** qullar/kölələr sinfi; **~ labour** qul/kölə əməyi; **~ obedience** qul/kölə kimi itaət etmə; 2. yaltaq, yaltaqcasına; qulluq göstərən, quyruq bulayan; 3. asılı; **a ~ state** asılı dövlət

**servilely** ['sə:vaıllı] *adv* qul/kölə kimi, köləcəsinə

**servilism** ['sə:vaılızm] *n* yaltaqlıq, alçalma

**servility** [sə:'vılətı] *n* yaltaqlıq, alçalma, qulluq göstərmə, quyruq bulama

**serving** ['sə:vıŋ] *n* 1. porsiya *(bir şeyin müəyyən miqdarı)*, parça, tikə; bir parça/tikə; **to cut some ~s from an apple-tart** alma piroqundan bir neçə tikə/parça kəsmək; 2. topu oyuna daxil etmək *(tennis oyununda)*

**servitude** ['sə:vıtju:d] *n* 1. köləlik, qulluq; əsarət; əsarət altına alma/salma; asılılıq; **to rebel against ~** köləliyə/ əsarətə qarşı üsyan etmək /qiyam qaldırmaq; **to keep in ~** köləlikdə/əsarətdə/asılılıqda saxlamaq; **to deliver from ~** köləlikdən/əsarətdən/asılılıqdan azad etmək; 2. *hüq.* katorqa, çox ağır iş; **penal ~ for life** ömürlük katorqa

**sesame** ['sesəmı] *n bot.* küncüt

**session** ['seʃn] *n* 1. iclas; **plenary ~** plenar iclası; **private/ secret ~** bağlı/gizli iclas; **~s of commission** komissiyanın iclasları; **an emergency ~** fövqəladə iclas; **the next ~ of parliament** parlamentin növbəti/gələn iclası; *Parliament is not in session during the summer Yay müddətində parlament iclas keçirmir*; 2. *hüq.* məhkəmə iclası; **closed ~** məhkəmənin qapalı iclası; **in full ~** açıq məhkəmə iclasında; 3. semestr, yarımillik *(ali məktəblərdə dərs ilinin yarısı)*; **the summer ~** yay semestri;

◊ **Summer ~s** müəllimlərin yay təkmilləşdirmə kursları

**set**[1] [set] *n* I 1. dəst, komplekt; **a ~ of tools** bir dəst/komplekt alət; **a ~ of chairs** bir dəst stul; 2. külliyyat; **complete ~ of Dicken's novels** Dikkensin romanlarının tam külliyyatı; 3. cərgə, sıra, seriya; **a ~ of houses** bir cərgə ev; **a ~ of lectures** bir seriya mühazirə; **a ~ of questions** bir sıra suallar; 4. qrup; **a ~ of men** bir qrup adam; 5. dairələr; **the political/the literary ~** siyasi/ədəbi dairələr; 6. radioqəbuledici apparat, radio aparatı; 7. *id.* bir partiya/əl/oyun; **to win the first ~** birinci partiyanı udmaq

**set** [set] *n* II 1. *(ancaq təkdə işlənir)* xətt; ümumi şəkil/təsəvvür; **the ~ of the drapery** bəzəyin xətti; **the ~ of the hills** dağların ümumi şəkli; 2. quruluş; konfiqurasiya *(xarici görünüş)*; bədən quruluşu; **of a manly ~** kişi bədənli adam; 3. *(ancaq təkdə işlənir)* istiqamət; **the ~ of a tide /of a current/of wind** qabarmanın/axının/küləyin istiqaməti; 4. meyl; təmayül, tendensiya; **the ~ of public opinion** ictimai fikrin meyli/tendensiyası; 5. *(ancaq təkdə işlənir)* batma *(günəş haq.)*; **at ~ of the sun** günəş batanda;

◊ **to be at a dead ~** 1) batmaq, ilişib /batıb qalmaq; 2) kəskin tənqid etmək, bir kəsə hücum etmək

**set**[2] [set] *adj* 1. durğun, tərpənməyən, hərəkətsiz; donuq, sabit; **~ smile** donuq təbəssüm; **~ stare** donuq/durğun baxış; **~ phrase** sabit fraza; 2. qəti, qəti müəyyənləşmiş, həmişəlik; **~ wage** qəti müəyyənləşmiş maaş/ əməkhaqqı; 3. sabit; dəyişməyən; **~ price** sabit qiymət; **~ rules** sabit/dəyişməyən qaydalar; 4. əvvəlcə şərtləşdirilmiş/təyin edilmiş; **~ arrangements** əvvəlcə şərtləşdirilmiş öhdəçiliklər/öhdəliklər; **at a ~ time** əvvəlcə müəyyənləşdirilmiş/təyin edilmiş vaxtda; **~ speech** 1) əvvəlcədən hazırlanmış nitq; 2) rəsmi nitq; 5. inadlı, inadcıl, qətiyyətli; **a man of ~ opinion** fikrində qətiyyətli/inadcıl olan adam; 6. qəsdən, qəsdlə/qərəzlə edilən; **on ~ purpose** qəsdən, bilə-bilə;

◊ **~ dinner** ziyafət; **~ fair** yaxşı, açıq *(hava haq.)*; *The weather is now set fair Hava indi yaxşılaşıb*; **to be hard ~** çətin/çıxılmaz vəziyyətdə olmaq; **to be hard ~ for money** pula çox ehtiyacı olmaq; **to be sharp ~** bərk açmaq; **to get ~** kökəlmək, yoğunlaşmaq

**set**[3] [set] *v* (**-tt-**; *pt, pp* **set**; *pr.p* **setting**) 1. qoymaq, düzmək, yerləşdirmək; **to ~ a cup/a glass/ a plate/a fork/a knife on the table** stolun üstünə fincan/ stəkan/boşqab/ çəngəl/bıçaq qoymaq; **to ~ smth. in its place again** bir şeyi yenidən öz yerinə qoymaq; **to ~ a chair at/by the table** stulu stolun arxasına/yanına qoymaq; **to ~ chairs for visitors** qonaqlar üçün stullar düzmək/yerləşdirmək/qoymaq; **to ~ one's hand on smb.'s shoulder** əlini bir kəsin çiyninə qoymaq; **to ~ a crown on smb.'s head** bir kəsin başına tac qoymaq; 2. oturtmaq, əyləşdirmək; mindirmək; **to ~**

*smb.* **by the fire** bir kəsi ocağın yanında oturtmaq; **to ~ *smb.* on horseback** bir kəsi ata mindirmək; **to ~ a king on a throne** kralı taxta oturtmaq; 3. taxmaq, keçirmək; **to ~ the wheel on the axe** təkəri oxa taxmaq/keçirmək; 4. salmaq; **to ~ glass in a window** pəncərəyə şüşə salmaq; 5. çevirmək, döndərmək; **to ~ *one's* face towards the sun** üzünü günəşə çevirmək/döndərmək; 6. hazırlamaq; köklənmək; **to ~ a piano** pianonu köklənmək; 7. təyin/müəyyən etmək; qoymaq; **to ~ standards** standartları/normaları müəyyən etmək; **to ~ a boundary** sərhədi təyin/müəyyən etmək; **to ~ limit to *smth.*** bir şeyə həddi/sərhəd qoymaq; **to ~ the pace** qaçışın sürətini təyin etmək; **to ~ a wedding day** toy günü təyin etmək; *The time and date of the meeting have not yet been set İclasın vaxtı və günü hələ təyin/müəyyən edilməyib*; **to ~ a price** qiymət qoymaq/təyin etmək; **to ~ a price on *smb.'s* head** bir kəsin başına qiymət qoymaq; **to ~ a fine** cəriməni təyin/müəyyən etmək; 8. tutmaq, durmaq *(paltar haq.)*; **to ~ well/badly** yaxşı/pis tutmaq/durmaq *(paltar haq.)*; *The jacket sets well/badly Jaket yaxşı/pis durur*; 9. batmaq *(göy cisimləri haq.)*; *The sun is setting Günəş batır*; 10. qurmaq *(saatı)*; düzəltmək *(saatın əqrəbini və s.)*; **to ~ a watch/a clock** saatı düzəltmək; **to ~ the hands of a clock** saatın əqrəblərini düzəltmək; **to ~ *one's* watch by the town clock** saatını şəhər saatı ilə düzəltmək/qurmaq; *I want you to set your watch by mine Mən istəyirəm ki, sən/siz saatını/saatınızı mənim saatımla düzəldəsən/düzəldəsiniz*; 11. qoymaq *(məqsəd və s.)*; **to ~ a goal** məqsəd qoymaq; 12. vermək *(tapşırıq, sual, dərs və s.)*; **to ~ a task** tapşırıq vermək; **to ~ a sum** tapşırıq vermək *(hesabdan)*; **to ~ the lesson for tomorrow** sabaha dərs vermək; *The teacher set his pupils a difficult problem Müəllim şagirdlərinə çətin tapşırıq verdi; What questions were set in the examination? İmtahanda hansı suallar verildi?* 13. göstərmək *(nümunə)*; **to ~ a good /bad example** yaxşı/ pis nümunə göstərmək; *He has set a good example for me to follow O mənə götürmək üçün yaxşı nümunə verdi*; 14. salmaq *(dəb)*; **to ~ the fashion** dəb salmaq, dəbə mindirmək; 15. qıcamaq, sıxmaq *(dişi)*; **to ~ *one's* teeth** dişlərini qıcamaq; 16. büzülmək *(dodaqlar haq.)*; *His lips set Onun dodaqları büzüldü*; 17. donmaq, hərəkətsiz olmaq *(göz, sifət haq.)*; *He was sitting his face set O, sifəti donmuş halda oturmuşdu*; 18. bərkimək *(sement və s. haq.)*; *The mortal joining these bricks hasn't set yet Bu kərpicləri birləşdirən məhlul hələ bərkiməyib*; 19. qatılaşmaq, laxtalaşmaq *(qan, zülal)*; 20. kəskinləşmək, çürümək *(süd)*; 21. formalaşmaq *(xasiyyət, bədən quruluşu)*; 22. rekord vurmaq; *He set a new record for the half mile O, yarım mil üçün yeni rekord vurdu (qaçmaqla)*; 23. sağanağa salmaq *(qiymətli daşı)*; **to ~ diamonds** brilyantları sağanağa salmaq; 24. açmaq *(stol)*; *The table was set for dinner Stol nahar üçün açılmışdı*; **to ~ out the table** 1) stol açmaq; 2) hər şeyi stolun üstünə qoymaq/düzmək *(qab-qacağı və s.)*; 25. yerinə salmaq *(sümüyü)*; **to ~ a bone** sümüyü yerinə qoymaq *(çıxmış sümüyü)*; **to ~ a broken leg/arm** sınmış ayağı/qolu yerinə salmaq; **to ~ a dislocated joint** çıxmış oynağı yerinə salmaq; 26. düzəltmək *(şlyapanı, qalstuku və s.)*; **to ~ *one's* cap** papağını düzəltmək; 27. yığmaq *(saçı)*; **to ~ *one's* hair** saçını yığmaq; 28. itiləmək *(bıçağı və s.)*; **to ~ a knife** bıçağı itiləmək; 29. qoymaq *(növbətçi, keşikçi)*; **to ~ the guard** *hərb.* keşikçi qoymaq; 30. çıxartmaq *(sahilə, adaya və s.)*; **to ~ troops on shore** sahilə qoşun çıxartmaq; 31. ümid olmaq, bel bağlamaq; **to ~ *one's* hope on *smb.*** bir kəsə bel bağlamaq/ümid olmaq; 32. qoymaq *(qadağa və s.)*; **to ~ a veto on *smth.*** bir şey üzərinə qadağa qoymaq; **to ~ a fine** cərimə qoymaq; 33. vurmaq, basmaq *(möhür)*; **to ~ a seal** 1) möhür vurmaq/basmaq; 2) iz buraxmaq/ qoymaq; *It set a seal on his life Bu onun həyatında iz buraxdı*; 34. əkmək, basdırmaq *(bitki, toxum)*; **to ~ fruit-trees** meyvə ağacı əkmək/basdırmaq; 35. tərtib etmək, yoxlamaq *(imtahan materiallarını)*; **to ~ an examination paper** imtahan üçün yazı işi tərtib etmək; **to ~ questions in an examination** imtahan üçün suallar tərtib etmək; *We have to fresh papers Biz yazı işini təzələməliyik*; 36. yatırmaq *(qırt düşmüş toyuğu yumurta üstündə)*; qoymaq *(qırt toyuğun altına yumurta)*; 37. yapmaq *(çörəyi təndirə)*; 38. *poliq.* *(həm də* **to ~ up***)* düzmək, yığmaq *(şrifti)*; 39. sazlamaq, qaydaya salmaq *(dəzgahı)*; **to ~ about doing *smth.*** bir şeyi etməyə başlamaq/girişmək; **to ~ *one's* work** işinə girişmək; *He set about writing a letter to his family O, ailəsinə məktub yazmağa başladı; I don't know how to set about it Mən bunu necə başlamağı bilmirəm*; **to ~ *smb.* about (doing) *smth.*** bir kəsi bir şey etməyə məcbur/təhrik etmək; **to ~ *smb.* about a task** bir kəsi tapşırığı yerinə yetirməyə başlamağa məcbur etmək; **to ~ oneself to *smth.*, to ~ oneself to do/doing *smth.*** bir şeyi etməyə ciddiyyətlə girişmək; **to ~ to work** işə girişmək/başlamaq; **to ~ about *one's* packing** şeylərini qablaşdırmağa başlamaq; **to ~ *smb.* (on) to (do) *smth.*** bir kəsi bir iş görməyə məcbur etmək; **to ~ *smb.* to saw wood** bir kəsi ağac mişarlamağa məcbur etmək; **to be ~ to do *smth.*** bir şeyi etməyə hazır olmaq; *We are set to go Biz getməyə hazırıq*; **to be ~ upon/on *smth.*** bir şeyi etməyi çox istəmək, bir şeyə nail olmağı qarşısına məqsəd qoymaq; *We didn't much like the idea of his going back to New York but he was set on it Biz onun Nyu Yorka qayıtmasını çox da istəmirdik, lakin o bunu etməyi qəti qərara almışdı*; **to ~ *smth.* in**



**motion** bir şeyi hərəkətə gətirmək; **to ~ a chain reaction in motion** *fiz.* zəncirvari reaksiyanı hərəkətə gətirmək; **to ~ free** azad etmək; **to ~ a prisoner free/at liberty** dustağı azad etmək; *Set your mind at ease! Sakit ol/olun!, Narahat olma/olmayın!*; **to ~ *smb.'s* mind at rest** bir kəsi sakitləşdirmək; **to ~ *one's* mind at rest** sakitləşmək; **to ~ at ready** *hərb.* hazır vəziyyətə gətirmək; **to ~ about** yaymaq; **to ~ about gossip** dedi-qodu yaymaq; **to ~ a rumour about** şayiə yaymaq; **to ~ apart** 1) yığmaq/ toplamaq *(pul)*; **to ~ apart out of *one's* savings** əmanətin bir hissəsini yığmaq; 2) ayırmaq, fərqləndirmək; *It sets him apart from the other Bu onu başqalarından ayırır/fərqləndirir*; **to ~ the women apart** qadınları ayırmaq *(kişilərdən)*; **to ~ the dogs apart** itləri ayırmaq *(boğuşan itləri)*; **to ~ ashore** sahilə çıxartmaq; **to ~ *smth.* ashore** bir şeyi sahilə çıxartmaq; **to ~ aside** 1) yığmaq, toplamaq, kənara qoymaq; **to ~ aside money** pul toplamaq/yığmaq; 2) nəzərə almamaq; **to ~ aside *one's* own interests** öz şəxsi maraqlarını nəzərə almamaq; 3) rədd/etiraz etmək; *He set all their offers aside O onların bütün təkliflərini rədd etdi*; 4) *hüq.* ləğv etmək; **to ~ aside a sentence** hökmü ləğv etmək; **to ~ back** 1) əvvəlki yerinə qoymaq; **to ~ the books back** kitabları əvvəlki yerinə qoymaq; 2) geri çəkmək; **to ~ the chairs back** stulları geri çəkmək; 3) geri döndərmək/çəkmək; **to ~ back the clock** saatı geri çəkmək; **to ~ down** 1) yerə qoymaq; *He set his load down O, yükünü yerə qoydu; She set the tray down on a table O, podnosu stolun üstünə qoydu*; 2) düşürmək; **to ~ down passengers** sərnişinləri düşürmək; *I'll set you down at your door Mən səni/sizi qapınızın ağzında düşürəcəm*; 3) yazmaq, qeyd etmək; **to ~ down *smb.'s* name and address** bir kəsin adını və ünvanını yazmaq; *Set down my address Mənim ünvanımı yaz/yazın; Set it down to my account Onu mənim hesabıma yaz/yazın*; 4) (for) təyin etmək; **to ~ *smb.* down for a job** bir kəsi işə təyin etmək; *The meeting is set down for Friday İclas cümə gününə təyin edilib*; **to ~ forth** 1) yola düşmək *(səyahətə və s.)*; **to ~ forth on a journey/travel** səyahətə yola düşmək; *Twenty minutes later we set forth İyirmi dəqiqədən sonra biz yola düşdük*; 2) izah/bəyan/şərh etmək; **to ~ scientific results** elmi nəticələri izah/şərh/bəyan etmək; **to ~ forth *one's* opinions at length** öz fikrini/mülahizəsini ətraflı şəkildə izah/şərh etmək; **to ~ forward** 1) yola düşmək; irəli getmək; *If we don't set forward soon, darkness will overtake us Biz tezliklə yola düşməsək, qaranlığa düşəcəyik*; 2) şərh/izah etmək; **to ~ forward theories** nəzəriyyələri izah/şərh etmək; 3) irəli sürmək; **to ~ in** 1) başlamaq, daxil olmaq; *Winter has set in very early this year Bu il qış çox tez başladı*; 2) düşmək; *Night was setting in Gecə düşürdü*; 3) əkmək, basdırmaq *(bitki və s.)*; **to ~ off** yola düşmək; **to ~ off on a journey** səyahətə yola düşmək; **to ~ off for London** Londona yola düşmək; 4) partlatmaq; **to ~ off a charge** *hərb.* partlayıcı maddə partlatmaq; 5) ayırmaq; **to ~ off a clause by a comma** budaq cümləni vergüllə ayırmaq; 6) ödəmək, kompensasiya vermək; **to ~ off a loss/a debt** itkini/borcu ödəmək; 7) bəzəmək; **to ~ off a dress with gold braid** paltarı qızıl tesma ilə bəzəmək; **to ~ out** 1) bayıra/çölə qoymaq; **to ~ out the empty milk-can** boş süd bidonunu çölə/bayıra qoymaq; 2) qoymaq, nümayiş etdirmək; **to ~ out vegetables for sale** tərəvəzi satışa qoymaq; 3) düzmək, yerləşdirmək; **to ~ out books on the table** kitabları stolun üstünə düzmək; 4) yola düşmək; **to ~ out on an expedition** ekspedisiyaya yola düşmək; *They set out early (the) next morning Onlar o biri səhər tezdən yola düşdülər*; 5) hazırlaşmaq, fikrinə düşmək; **to ~ out to write a novel** roman yazmaq fikrinə düşmək; 6) ətraflı şərh/izah etmək; **to ~ out *one's* ideas clearly** öz fikirlərini/mülahizələrini ətraflı şəkildə izah/şərh etmək; **to ~ up** 1) qoymaq, yerləşdirmək; **to ~ up a picture on the settlee** şəkli divanın üstünə qoymaq; 2) götürmək; **to ~ up a book** kitabı götürmək; 3) asmaq; **to ~ up a notice** elan asmaq; 4) ucaltmaq, qoymaq; **to ~ up a monument** abidə ucaltmaq/qoymaq; 5) əsasını/binasını qoymaq, təsis/təşkil etmək; **to ~ up a company** şirkət təsis/təşkil etmək; **to ~ up a committee** komitə təsis etmək; **to ~ up a laboratory** laboratoriya təşkil etmək; *This journal was set up in 1992 Bu jurnal 1992-ci ildə təsis edildi/edilib*; 6) qoymaq, müəyyən etmək; **to ~ up new order** yeni qayda-qanun qoymaq; 7) açmaq; **to ~ up a new shop** yeni mağaza açmaq; 8) qaldırmaq; salmaq; **to ~ up a hullabaloo** hay-haray/səs-küy qaldırmaq; **to ~ up a cry** qışqırıq salmaq; 9) məşq etdirmək; möhkəmlətmək, bərkitmək; *Physically he was not set up Fiziki cəhətdən o, möhkəm deyildi*; 10) səbəb olmaq; *The cold air set up an irritation in his throat Soyuq hava onun boğazını qıcıqlandırdı*; 11) *poliq.* yığmaq, düzmək *(şrifti)*; **to ~ up a book** kitab yığmaq; 12) fəxr etmək; *I am quite set up with my new job Mən yeni/təzə işimlə fəxr edirəm*;

◊ **to ~ much/a great deal on *smth.*** bir şeyə çox əhəmiyyət vermək; **to ~ little on *smth.*** bir şeyə bir az əhəmiyyət vermək; **to ~ sail** yelkən açmaq, səyahətə başlamaq; **to ~ foot somewhere** bir yerə piyada getmək; **to ~ foot on shore** sahilə/quruya çıxmaq; **to ~ *one's* feet on the path** yola düşmək; **to ~ *smb.* up on his feet** bir kəsi ayağa qaldırmaq, bir kəsə kömək etmək; **to ~ *smb.'s* heart at rest** bir kəsin ürəyini sakitləşdirmək; **to ~ things to rights** hər şeyi

qaydaya salmaq/qoymaq

**settee** [se'ti:] *n* balaca/kiçik divan

**setter** ['setə<sup>r</sup>] *n* 1. setter *(it cinsi)*; 2. *k.t.* əkici maşın; 3. quran, qoyan *(tələ)*; **the ~ of a trap** tələ quran

**setting** ['setıŋ] *n* 1. sağanaq, çərçivə; **gold ~** qızıl sağanaq; **the ~ of a jewel** qiymətli daşın sağanağı; 2. mühit; yer; **romantic ~** romantik mühit; *The setting of the play is Venice Pyesin vaqe olduğu yer Venesiyadır*; 3. bədii tərtibat *(tamaşa, kinofilm üçün)*; 4. sözə musiqi yazmaq; 5. *mus.* aranjirovka, bəstələmə, tərtib etmə, uyğunlaşdırma; **~ for piano** piano üçün aranjirovka/ uyğunlaşdırma; 6. batma *(günəş haq.)*; **the ~ of the sun** günəşin batması; 7. yumurta *(qırt toyuğun üstündə yatdığı)*

**setting-up** ['setıŋ'ʌp] *n tex.* yığma, montaj

**settle** ['setl] *v* 1. həll etmək, qərar qəbul etmək; **to ~ a question once and for all** məsələni birdəfəlik/ həmişəlik həll etmək; *Everything is settled Hər şey həll olunub; Settle it any way you like Bunu necə istəyirsən/istəyirsiniz, elə də et/edin*; 2. razılaşmaq, razılaşdırmaq; **to ~ the price** qiyməti razılaşdırmaq; 3. müəyyənləşdirmək; **to ~ the date of *one's* return** qayıtma tarixini müəyyənləşdirmək; 4. hesablaşmaq; bir kəslə hesabı kəsmək; **to ~ with *one's* creditors** kreditorlarla/kredit verənlərlə hesablaşmaq; 5. qaydaya salmaq, həll etmək; **to ~ points of difficulty** çətinliyi qaydaya salmaq/həll etmək; 6. aradan qaldırmaq; **to ~ differences** fərqləri/ziddiyyətləri aradan qaldırmaq; **to ~ an argument** mübahisəni aradan qaldırmaq; 7. köçmək, məskunlaşmaq *(həm də* **to ~ down**); **to ~ in London /in the country** Londonda/kənddə məskunlaşmaq; 8. köçürmək, məskunlaşdırmaq; **to ~ *smb.* in a new country** bir kəsi yeni ölkəyə köçürmək/ölkədə məskunlaşdırmaq; 9. əyləşmək, oturmaq *(həm də* **to ~ down**); **to ~ in a chair/in a car** stulda/maşında oturmaq; **to ~ oneself in the saddle** yəhərdə oturmaq; 10. əyləşdirmək, oturtmaq; **to ~ *smb.* in an armchair** bir kəsi kresloda oturtmaq; 11. çökmək, oturmaq; düşmək *(həm də* **to ~ down**); **to let *smth.* ~** bir şeyi çökməyə qoymaq; *The dust settled slowly Toz yavaş-yavaş çökdü/oturdu; The leaf settled to the ground Yarpaq torpağa düşdü*; 12. qaydaya salmaq, sakitləşdirmək; **to ~ *(one's)* nerves** əsəblərini sakitləşdirmək; **to ~ *one's* mind** sakitləşmək; 13. geyinmək; taxmaq; **to ~ *one's* hat** papağını geyinmək; **to ~ *one's* feet in the stirrups** ayaqlarını üzəngiyə taxmaq/qoymaq; 14. ödəmək *(həm də* **to ~ up**); **to ~ a bill/an account** hesabı ödəmək; **to ~ a debt** borcu ödəmək; 15. aradan qaldırmaq, yox etmək; götürmək; **to ~ hesitations** əndişələri aradan qaldırmaq; **to ~ *smb.'s* doubts** bir kəsin şübhələrini yox etmək; 16. oturmaq, qonmaq *(quş, həşərat və s. haq.)*; *The bird settled on a branch/on a tree Quş budağa/ağaca qondu*; 17. asılmaq *(duman, bulud haq.)*; *Dark clouds settled over the village Qara buludlar kəndin üstündən asılmışdı*; 18. hakim kəsilmək; *A deep silence settled in the room Otağa dərin bir sükut hakim kəsildi*; 19. enmək, batmaq *(gəmi)*; *The ship was settling Gəmi batırdı*; 20. düzəlmək, qaydaya düşmək *(hava haq.)*; *The weather has settled at last Nəhayət hava düzəldi/ qaydaya düşdü*; 21. sakitləşmək *(tufan haq.)*; **to ~ for *smth.*** *d.d.* razılaşmaq, kifayətlənmək; *I would settle for three hundred dollars Mən üç yüz dollara razılaşardım*; **to ~ upon/on *smth.*** bir şey üzərində dayanmaq, müəyyən qərar qəbul etmək; **to ~ upon a plan** bir plan üzərində dayanmaq; **to ~ *smth.* on *smb.*** *hüq.* vəsiyyət etmək; **to ~ *one's* property on *smb.*** malını/əmlakını bir kəsə vəsiyyət etmək; **to ~ down** köçmək, məskunlaşmaq; **to ~ down in some place/in a town** bir yerdə/bir şəhərdə məskunlaşmaq; **to ~ off** yatırtmaq; *She settled off the child O, uşağı yatırtdı*; **to ~ up** qurtarmaq, sona çatdırmaq; **to ~ up *one's* affairs** işlərini qurtarmaq/sona çatdırmaq;

◊ **to ~ *smb.'s* hash** bir kəsi susmağa məcbur etmək, bir kəsin ağzını yummaq; **to ~ down for life** evlənmək, ailə qurmaq; **to ~ a sail** yelkəni yığmaq/aşağı salmaq; **to ~ *smb.'s* goose** bir kəsin axırına çıxmaq, bir kəsi öldürmək

**settled** ['setld] *adj* 1. daimi, həmişəlik; arasıkəsilməz; **~ melancholy** daimi qəm/qüssə; **~ rain** daimi/arasıkəsilməz yağış; 2. möhkəm, davamlı; **~ peace** möhkəm sülh; **a ~ order of government** möhkəm hakimiyyət; 3. müəyyən, dəyişməz; **~ opinion/purpose** dəyişməz fikir/məqsəd; **~ convinction** dəyişməz inam; 4. məskunlaşmış, əhali yerləşdirilmiş; **the ~ portions of the island** adanın əhali yerləşdirilmiş hissələri; 5. çökmüş *(özül və s. haq.)*; 6. sakit, təmkinli; **a ~ face** sakit üz/sifət; 7. ritmli, ahəngli; **~ life** ritmli həyat; 8. həll edilmiş, cavabı tapılmış *(sual, mübahisə və s.)*; **a ~ question** həll edilmiş məsələ; 9. ödənilmiş *(hesab haq.)*; 10. vəsiyyət edilmiş

**settlement** ['setlmənt] *n* 1. məskunlaşdırılma, məskun edilmə; **to make a ~** məskunlaşdırmaq; 2. məskən, məntəqə, kənd; qəsəbə; 3. nizama/qaydaya salma, yoluna qoyma; saziş, müqavilə; **peaceful/peace ~** sülh yolu ilə nizama/qaydaya salma; **terms of ~** sazişin/müqavilənin şərtləri; **~ of a dispute** mübahisəni qaydaya salma; **to make/to arrange a ~ with *smb.*** bir kəslə razılaşmaq/razılığa gəlmək; **to come to/to reach a ~ of *one's* differences** mübahisəli məsələlərdə razılığa gəlmək; 4. hesab, hesablaşma, hesab çəkmə; ödəmə *(borcu)*; **cash ~** nəqd pulla hesablaşma/ödəmə; **~ with creditors** 1) borc verənlə müqavilə; 2) borc verənlə



hesablaşma; **~ of an account** hesab üzrə borcu verib qurtarma; **~ of a debt** borcu ödəmə; 5. *hüq.* əmlaka sahib olma haqqında akt; **to make a ~ on *smb.*** 1) əmlakı bir kəsin ixtiyarına vermək; 2) kəbin kontraktı/ müqavilənaməsi; 3) qıza cehiz vermək haqqında müqavilə; **to draw up a marriage ~** kəbin müqaviləsi tərtib etmək; 6. xeyriyyə təşkilatı; 7. çökmə; çöküntü

**settler** ['setlə<sup>r</sup>] *n* 1. mühacir, bir yerə köçüb məskunlaşan/ yerləşən ilk adam; kolonist; 2. *tex.* durulducu hovuz/çən; separator *(cihaz)*

**seven** ['sevn] *num* 1. yeddi; *Seven and seven make fourteen Yeddi üstəgəl yeddi on dörd eylər; There were seven of them Onlar yeddi idilər*; 2. yeddinci; **chapter ~** yeddinci fəsil; **Room ~** yeddinci otaq; **in ~** yeddi-yeddi; 3. yeddi yaş; *He is seven Onun yeddi yaşı var*; **at ~** yeddi yaşında; **a girl of ~** yeddi yaşında qız; 4. saat yeddi; *He will come at seven O, saat yeddidə gələcək*

**sevenfold**[1] ['sevnfould] *adj* 1. yeddiqat, yeddiqatlı; 2. yeddiqat artırılmış

**sevenfold**[2] ['sevnfould] *adv* yeddi dəfə /qat; **to increase ~** yeddi dəfə/qat artırmaq

**seventeen** ['sevn'ti:n] *num* 1. on yeddi; *Seventeen and seventeen make thirty-four On yeddi üstəgəl on yeddi otuz dörd eylər; There are seventeen of them Onlar on yeddi nəfərdirlər*; 2. on yeddinci; **chapter ~** on yeddinci fəsil; **Room ~** on yeddinci otaq; 3. on yeddi yaş; *He's seventeen O, on yeddi yaşındadır, Onun on yeddi yaşı var*; **a girl of ~** on yeddi yaşlı qız

**seventeenth**[1] ['sevn'ti:nθ] *n* on yeddinci; **on the ~ of May** mayın on yeddisində

**seventeenth**[2] ['sevn'ti:nθ] *adj* on yeddinci; *He is in his seventeenth year O, on yeddi yaşındadır*

**seventh** ['sevnθ] *num* yeddinci; **the ~ lesson** yeddinci dərs; *You are the seventh to ask me about it Sən/Siz bu barədə məndən soruşan yeddinci adamsan/ adamsınız;*

◊ **to be in the ~ heaven** göyün yeddinci qatında olmaq

**seventieth** ['sevntıθ] *num* yetmişinci; *He is in his seventieth O, yetmiş yaşındadır*

**seventy** ['sevntı] *num* 1. yetmiş; **~ soldiers** yetmiş əsgər; 2. yetmişinci; **chapter ~** yetmişinci fəsil; **Room ~** yetmişinci otaq

**sever** ['sevə<sup>r</sup>] *v* 1. kəsmək, ayırmaq; **to ~ a bough from the trunk** düyünü gövdədən kəsmək; **to ~ *smb.'s* head from his body** bir kəsin başını bədənindən ayırmaq; 2. *məc.* ayırmaq, ayrılmaq, ayrı salmaq; **to ~ husband and wife** ər-arvadı ayırmaq; **to ~ friends** dostları ayrı salmaq; **to ~ oneself from society** cəmiyyətdən ayrılmaq/ ayrı düşmək; 3. kəsmək; **to ~ rope with a knife** kəndiri/ipi bıçaqla kəsmək; **to ~ diplomatic relations** diplomatik əlaqələri kəsmək; 4. qırılmaq; *The rope severed under the strain Kəndir dartılmadan qırıldı*

**several** ['sevrəl] *adj* 1. bir neçə; **~ days /weeks /years** bir neçə gün/həftə/il; **~ books on the same subject** eyni məsələ üzrə bir neçə kitab; *We have got several letters this morning Biz bu səhər bir neçə məktub almışıq*; 2. müxtəlif; çeşidli, cürbəcür, başqa-başqa, ayrı-ayrı; **the works of ~ artists** müxtəlif rəssamların əsərləri

**severally** ['sevrəlı] *adv* 1. ayrı-ayrı, ayrılıqda, fərdi olaraq; *The guests were received severally Qonaqlar fərdi olaraq /ayrı-ayrı qəbul edildi*; 2. növbə ilə; 3. müvafiq olaraq

**severance** ['sevərəns] *n* 1. ayrılma; **~ from the Empire** imperiyadan ayrılma; 2. kəsmə, kəsilmə, qırma, qırılma; **the ~ of diplomatic relations** diplomatik əlaqələrin kəsilməsi; **the ~ of family ties** ailə əlaqələrinin kəsilməsi/qırılması

**severe** [sı'vıə<sup>r</sup>] *adj* (-r, -st) 1. ciddi, zabitəli, sərt, kəskin; **~ looks** ciddi/zabitəli/sərt görkəm; **~ sentence** sərt/kəskin hökm; **~ punishment** ciddi cəza; **~ criticism** kəskin/ ciddi/sərt tənqid; **to say *smth.* in a ~ voice** bir şeyi zabitəli/kəskin səslə demək; 2. tələbkar; **~ teacher/father** tələbkar müəllim/ata; **to be ~ upon/on *smb.*** bir kəsə qarşı tələbkar olmaq; 3. bərk, sərt; **~ discipline** sərt intizam; 4. soyuq, sərt *(hava, iqlim və s. haq.)*; **~ winter** soyuq/sərt qış; **~ frost** sərt şaxta; 5. güclü *(tufan və s. haq.)*; **~ storm** güclü tufan; 6. ağır, ciddi *(xəstəlik, yaralanma və s. haq.)*; **~ illness** ağır/ciddi xəstəlik; **~ wound** ağır/ciddi yara; **~ loss** ağır itki; 7. dərin, güclü *(hiss haq.)*; **~ disappointment** dərin ümidsizlik; 8. çətin; **~ training** çətin hazırlıq; 9. acı, kəskin; istehzalı; **~ remarks** acı/istehzalı iradlar

**severely** [sı'vıəlı] *adv* 1. ciddi, qəti, ciddi/qəti surətdə; çox sərt/ciddi, şiddətli; **to be punished too ~** çox ciddi cəzalandırılmaq; **to look at *smb.* ~** bir kəsə ciddi/çox sərt baxmaq; 2. ağır, bərk; **to be ~ ill** ağır/bərk xəstə olmaq; **to suffer ~ from the cold** soyuqdan bərk əziyyət çəkmək; *The night was severely cold Gecə çox bərk soyuq idi*; 3. son dərəcə dəqiq/dürüst, incədən-incə;

◊ **to leave/to let ~ alone** əsla diqqət verməmək, tamamilə laqeydlik göstərmək

**severity** [sı'verıtı] *n* 1. ciddilik, ciddiyyət, qətilik; tələbkarlıq, zabitəlilik; **to punish *smb.* with ~** bir kəsə ciddi cəza vermək; bir kəsi ciddi cəzalandırmaq; 2. rəhmsizlik, amansızlıq, qəddarlıq, zalımlıq; 3. sərtlik; **the ~ of a climate** iqlimin sərtliyi; **the ~ of the winter** qışın sərtliyi; 4. ciddilik, təhlükəlilik *(xəstəlik və s. haq.)*; **the ~ of an illness** xəstəliyin ciddiliyi; 5. çətinlik, ağırlıq *(yoxlama və s. haq.)*; 6. amansızlıq *(hücum, vuruş haq.)*

**sew** [sou] *v (pt* **sewed** [soud]; *pp* **sewn** [soun] *və ya* **sewed**) tikmək; **to ~ a dress** paltar tikmək; **to ~ pieces together** parçaları/hissələri bir yerə tikmək; **to ~ by hand/by machine** əllə/maşın-

la tikmək; **to ~ a button on/onto a shirt** köynəyə düymə tikmək; *Would you sew this button onto my shirt? Bu düyməni mənim köynəyimə tikərdinizmi?*

**sewing**[1] ['souɪŋ] *n* 1. tikmə, tikiş; *She brought her sewing and sat near me O, tikməsini gətirdi və mənim yanımda oturdu*; 2. sap; **silk ~** ipək sap

**sewing**[2] ['souɪŋ] *adj* tikmə, tikiş; **~ circle** tikmə/tikiş dərnəyi; **~ needle** tikiş iynəsi

**sewing-machine** ['souɪŋmə.ʃi:n] *n* tikiş/paltar maşını

**sewn** [soun] **to sew** *felinin pp forması*

**sex**[1] [seks] *n* cins; **male/female ~** kişi/qadın cinsi; **without distinction of age or ~** yaşa və cinsə fərq qoymadan; **the opposite ~** əks cins; **the fair ~, the weak ~** zərif cins, qadınlar; **the sterner/the stronger ~** güclü cins, kişilər

**sex**[2] [seks] *adj* cinsi; **~ instinct** cinsi instinkt; **~ appeal** cinsi cazibədarlıq *(adət. qadınlarda)*; **a ~ book** pornoqrafik kitab

**sex-** [seks-] *(həm də* **sexi-** *mürəkkəb sözlərin komponenti; Azərbaycan türkcəsində* **altı-** *mənasını verir*; sexangular **altı**bucaq; sexdigital **altı**barmaq; sexvalent **altı**valentli; sexisyllable **altı**hecalı

**sexed** [sekst] *adj* cinsi olan *(heyvan və ya bitki haq.)*

**sexennial** [sek'senjəl] *adj* altıillik, altı il davam edən, hər altı ildə baş verən

**sexily** ['seksɪlɪ] *adv* qızğınlıqla, şəhvətlə, qızğın (bir) tərzdə

**sexiness** ['seksɪnɪs] *n* qızğınlıq, seksuallıq, şəhvət, şəhvanilik

**sexivalent** [seksɪ'veɪlənt] *adj kim.* altıvalentli

**sexless** ['sekslɪs] *adj* 1. *biol.* cinsiyyətsiz, qeyri-cinsi; **~ flowers** cinsiyyətsiz çiçəklər; 2. cinsi hissi olmayan, soyuq

**sexual** ['seksjuəl] *adj* cinsi; seksual; **~ organs** cinsi orqanlar; **~ disease** tənasül xəstəlikləri; **~ heat** çərə axıtma, hövrə/kürsəyə gəlmə *(heyvanlar haq.)*; **~ selection** cinsi seçmə; **~ intercourse** cinsi əlaqə

**sexuality** [.seksju'ælɪtɪ] *n* 1. cinslərin fərqi; 2. cinsiyyət, şəhvaniyyət, seksuallıq

**sexually** ['seksjuəlɪ] *adv* cinsi baxımdan; **~ active** cinsi baxımdan aktiv/fəal

**sexy** ['seksɪ] *adj d.d.* həddən artıq seksual/qızğın; **~ girls** seksual qızlar

**shabbily** ['ʃæbɪlɪ] *adv* 1. yoxsul, kasıb; **to live ~** yoxsul/ kasıb yaşamaq; 2. nimdaş, köhnə; **to dress ~** köhnə/ nimdaş geyinmək

**shabbiness** ['ʃæbɪnɪs] *n* 1. köhnəlik, nimdaşlıq; 2. kasıblıq, yoxsulluq; düşkünlük; 3. yazıqlıq, zavallılıq

**shabby** ['ʃæbɪ] *adj* (-ier, -iest) geyilmiş, didilmiş, sürtülmüş, köhnəlmiş, nimdaş *(paltar haq.)*; **~ clothes** sürtülmüş/ köhnəlmiş paltarlar; **a ~ hat** geyilmiş/nimdaş papaq; *He wore a shabby gray suit O, nimdaş boz kostyum geyinmişdi*; **to become too ~** çox köhnəlmək, üzülmək, dağılmaq *(paltar haq.)*; 2. cındır/cır-cındır geymiş; **to look ~** dilənçi qiyafəsində /kökündə olmaq; 3. kasıb, yoxsul, dilənçi; düşkün, kasıblamış, yoxsullaşmış; **a ~ room** kasıb otaq; **~ neighbourhood** yoxsullaşmış rayon; 4. yazıq, bədbəxt, acınacaqlı, zavallı; şərəfsiz; **~ existence** şərəfsiz/acınacaqlı/zavallı yaşayış; 5. köhnə, çox köhnəlmiş, başlı-başına buraxılmış, yarımuçmuş, yarımdağılmış *(bina və s. haq.)*; **a ~ house** çox köhnəlmiş/ yarımdağılmış ev; 6. pis, ucuz *(hədiyyə haq.)*; **a ~ present** pis/ucuz hədiyyə; 7. alçaq, yaramaz, şərəfsiz, namussuz; **a ~ trick** yaramaz yalan; **to play a ~ trick on** *smb.* bir kəsə qarşı yaramaz hərəkət etmək; 8. xəsis, simic, xırdaçı

**shackle**[1] ['ʃækl] *n* 1. *(adət. pl)* qandal, buxov; **~s on the ankles/on the wrists** topuqlarda/biləklərdə qandal; **to make the ~s fast around** *smb.'s* **ankles/***smb.'s* **hands** bir kəsin topuqlarını/əllərini qandallamaq; 2. *məc.* zəncir, bağ, əlaqə; **the ~s of love** məhəbbət bağları/əlaqələri; *The shackles of slavery fell Köləlik zəncirləri dağıldı/qırıldı*

**shackle**[2] ['ʃækl] *v* 1. qandallamaq, buxovlamaq, qandal/ buxov vurmaq; *A smith was ordered to shackle him Dəmirçiyə əmr etdilər ki, onu qandallasın*; 2. *məc.* mane olmaq, sıxışdırmaq, buxovlamaq; əl-qolunu/əl-ayağını bağlamaq; **to be ~ed by stupid laws** axmaq qanunlarla əl-qolu bağlanmaq; 3. birləşmək, bağlanmaq; *The woman was shackled to him forever Qadın ona əbədi olaraq bağlandı*

**shade**[1] [ʃeɪd] *n* 1. kölgə; **in the ~ of a tree** ağacın kölgəsində; **to cast a ~ on** *smth.* bir şeyin üstünə kölgə salmaq; 2. çalar, ton; **material in all ~s of blue** mavi rəngin bütün çalarlarına malik parça; **in dark/in light ~s** tünd/açıq tonda; **the same colour in a lighter ~** açıq çalarlı eyni rəng; **delicate ~s of meaning in words** sözlərdə mənanın zərif çalarları; 3. *pl* toran, alaqaranlıq, qaş qaralan zaman; *The shades of evening/of night fall Qaş qaralır, Toran düşür*; 4. kabus; **the ~s of death** ölüm kabusu; 5. *pl şair.* gizli yer, sığınacaq; 6. ekran; abajur *(lampa qalpağı)*; 7. çətir, zontik;
◊ **in light and ~** işıqda və kölgədə

**shade**[2] [ʃeɪd] *v* 1. kölgələmək, kölgələnmək, kölgə salmaq; *Trees shade the street Ağaclar küçəyə kölgə salır*; 2. müdafiə etmək, qorumaq *(işıqdan, günəşdən)*; **to ~ one's eyes with one's hand** əli ilə gözünü qorumaq *(işıqda, günəşdən)*; **a hat that ~s one's eyes** gözü qoruyan *(günəşdən)* papaq/şlyapa; 3. qəmgin, tutqun, kədərli, qaşqabaqlı; *A sullen look shaded his face Sərt baxış onun üzünü kədərli/qəmli etdi*; 4. *inc.* tuşlamaq, kölgə vermək, kölgələmək *(şəkli)*; **to ~ a white spot** ağ ləkəni tuşlamaq; 5.



*amer.* bir az azaltmaq; *They shaded the price Onlar qiyməti aşağı saldılar/bir az azaltdılar*

**shaded** ['ʃeɪdɪd] *adj* 1. kölgəli; **a ~ path** kölgəli cığır; 2. qaranlıq; **a ~ doorway** qaranlıq dəhliz

**shadeless** ['ʃeɪdlɪs] *adj* kölgəsiz, kölgəsi olmayan

**shadeness** ['ʃeɪdɪnɪs] *n* kölgəlik, kölgə; *These birds live in the shadeness of the forest Bu quşlar meşənin kölgəliklərində yaşayır*

**shadow**[1] ['ʃædou] *n* 1. kölgə *(müəyyən formaya malik olan)*; **the ~ of the house/of the tree** evin/ağacın kölgəsi; **to cast/to throw a ~** 1) kölgə salmaq; *These trees cast long shadows Bu ağaclar uzun kölgələr salır; The earth's shadow sometimes falls on the moon Yerin kölgəsi bəzən ayın üzərinə düşür*; 2) *məc.* kədərləndirmək; ovqatını təlx etmək; 2. *pl* toran, qaş qaralma; *The shadows lengthen Toran qatılaşır*; 3. işarə; **a ~ of a smile** təbəssüm işarəsi; 4. həmişəlik yoldaş/ həmrah; *She's my shadow O mənim həmişəlik həmrahımdır/yoldaşımdır*; 5. papağın/şlyapanın kənarı; 6. *inc.* kölgə;
◊ **to be afraid of** *one's* **(own) ~** öz kölgəsindən qorxmaq; **to quarrel with** *one's* **own ~** mənasız yerə özündən çıxmaq; **to fight with** *one's* **own ~** öz kölgəsilə vuruşmaq, donkixotluq etmək

**shadow**[2] ['ʃædou] *v* 1. kölgələmək, kölgələndirmək, kölgə salmaq; müdafiə etmək, qorumaq *(günəşdən, işıqdan); Great trees shadowed this place Böyük ağaclar bu yerə kölgə salırdı*; 2. *şair.* kədərləndirmək, qəmləndirmək; *My childhood was shadowed by this affection Bu bədbəxtlik mənim uşaqlığımı kədərli etmişdi*; 3. qabaqcadan xəbər vermək, gələcəyi qabaqcadan bildirmək, gələcəkdən xəbər vermək *(həm də* **to ~ forth/out***); This event seemed to shadow forth a new kind of trouble Bu hadisə yeni bir pis hadisənin olacağını sanki xəbər verirdi*; 4. gizli işləmək; *I knew that I was being shadowed Mən bilirdim ki, məni izləyirlər*

**shadower** ['ʃædouə'] *n* izləyən, dalınca gedən; *I gave my shadower the slip Mən izlənməkdən yayındım*

**shadowy** ['ʃædouɪ] *adj* 1. kölgəli; **a ~ garden** kölgəli bağ; **a ~ corner** kölgəli künc; 2. qəmgin, kədərli; *Stillness lay through the shadowy marble halls Mərmər zallarda kədərli sükut hökm sürürdü*; 3. tutqun, dumanlı; anlaşılmaz, qeyri-müəyyən; *In my memory there was but a shadowy picture of the event Mənim yaddaşımda o hadisənin ancaq dumanlı xatirəsi qalmışdı*

**shady** ['ʃeɪdɪ] *adj* 1. kölgəli, kölgəlik; **a ~ yard** kölgəli həyət; **to keep ~** kölgədə qalmaq; 2. *d.d.* şübhəli, etibarsız; **a ~ man** şübhəli adam; *He's a rather shady man – I don't trust him O çox şübhəli adamdır – Mən ona etibar etmirəm*; 3. xarab, lax; **a ~ egg** xarab/lax yumurta;
◊ *I'm on the shady side of fifty Mənim yaşım əlli beşi keçib*

**shaft** [ʃa:ft] *n* 1. dəstə, sap, ağac; **the ~ of a spade/of an axe/of a hammer** belin/baltanın/çəkicin sapı; **the ~ of a flag** bayrağın ağacı; 2. ox; 3. şüa; **a ~ of lightning** şimşəyin şüası; 4. gövdə *(ağacda)*; 5. dişlə, çillə *(qoşqu alətində)*; 6. soba/tüstü borusu; 7. *mem.* sütun

**shag** [ʃæg] *n* maxorka *(həm də* **~ tobacco***)*

**shagged** ['ʃægd] *(həm də* **~ out***) adj* bərk/çox yorğun

**shaggy** ['ʃægɪ] *adj* 1. tüklü, qalıntüklü; pırtlaşıq; **~ hair** pırtlaşıq saç; **~ mane** qalıntüklü yal; **~ eyebrows** qalıntüklü qaşlar; 2. qıllı; **a ~ hog** qıllı axta donuz; 3. xovlu; **~ cloth** xovlu parça; 4. kələ-kötür, nahamar; **~ surface** kələ-kötür /nahamar səth; 5. kobud, nəzakətsiz; **~ manners** kobud xasiyyət/davranış; 6. kol-kos basmış, sıx ağac bitmiş; 7. budaqlı; **~ trees** budaqlı ağaclar

**shake**[1] [ʃeɪk] *n* 1. silkələmə, silkələnmə; **to give** *smth.* **a ~** bir şeyi silkələmək; **a ~ of the hand(s)** əl sıxma/silkələmə; **to give** *smb.'s* **hand a ~** bir kəsin əlini sıxmaq/silkələmək; *The dog gave itself a shake İt silkələndi*; 2. təkan; zərbə; **to give a ~** təkan vermək; **to be destroyed by the ~ of an earthquake** zəlzələnin təkanından uçmaq/dağılmaq; 3. titrəmə, titrəyiş; **the ~ of a ship in a storm** gəminin tufanda titrəməsi; 4. əsmə; **to show no ~ of fear** qorxudan əsla əsməmək; 5 **(the ~s)** qorxu; **to give** *smb.* **the ~s** bir kəsi qorxuya salmaq; 6. sarsıma, sarsılma; sarsıntı; *He changed completely after that shake O, sarsıntıdan sonra o, tamamilə dəyişdi*; 7. yarıq *(ağacda, torpaqda)*

**shake**[2] [ʃeɪk] *v (pt* **shook** [ʃuk]; *pp* **shaken** [ʃeɪkən]) 1. silkələmək, silkələnmək, əsdirmək, əsmək, yırğalamaq, yırğalanmaq; çırpmaq; **to ~ fruit from a tree** meyvəni silkələyib ağacdan salmaq; **to ~ (up) a pillow/a mattress** balışı/döşəyi çırpmaq; **to ~ carpets** xalçaları çırpmaq; **to ~ a table-cloth** süfrəni silkələmək; *The wind shook the windows Külək pəncərəni silkələdi; The whole building shakes when a train goes past Qatar keçib gedəndə bütün bina titrəyir/əsir*; **to ~ with cold/with fear** soyuqdan/qorxudan əsmək/titrəmək; **to ~** *smb.'s* **hand, to ~** *smb.* **by the hand** bir kəsin əlini sıxmaq/silkələmək; 2. yırğalamaq *(başını)*; **to ~** *one's* **head** başını yırğalamaq *(şübhə, narazılıq və s. əlaməti olaraq); He shook his head in answer to my question Mənim sualıma cavab olaraq o, başını yırğaladı*; 3. sarsıtmaq; *I was shaken with/at the news Xəbər məni sarsıtdı, Mən xəbərdən sarsıldım*; 4. zəiflətmək; **to ~ the foundation** özülü /təməli zəiflətmək; **to ~ down** 1) vurub salmaq *(meyvəni ağacdan)*; 2) uçurtmaq, sökmək *(evi); We were evicted and our shack was shaken down Bizi köçürdülər və daxmamızı uçurdu-*

*lar/sökdülər*; 3) silkələmək, silkələyib sıxlaşdırmaq; **to ~ down the sugar in the bag** qəndi torbada silkələyib sıxlaşdırmaq; **to ~ off 1)** çırpmaq *(tozu və s.)*; 2) qurtulmaq, xilas olmaq, canını qurtarmaq; **to ~ out** çırpmaq/çırpıb təmizləmək; **to ~ up 1)** çalxamaq, çalxalamaq; *The medicine must be shaken up before drinking İçməzdən əvvəl dərmanı çalxalamaq lazımdır*; 2) çırpmaq; **to ~ up a pillow** balışı çırpmaq;
◊ **to ~ a leg/a foot/*one's* bones 1)** oynamaq, rəqs etmək; 2) *amer.* tələsmək; **to ~ a loose/a free leg** səliqəsiz/ pozğun həyat sürmək; **to ~ like an aspen leaf** ağcaqovaq yarpağı kimi əsmək; **to ~ in *one's* shoes/in *one's* boots** qorxudan əsmək/titrəmək

**shaker** [ˈʃeɪkəʳ] *n* şeyker *(kokteyl qarışdırmaq üçün boru)*

**shaking** [ˈʃeɪkɪŋ] *n* çalxalama; **to give *smth.* a good ~** bir şeyi yaxşı-yaxşı çalxalamaq

**shaky** [ˈʃeɪkɪ] *adj* 1. laxlayan, tərpənən; **a ~ chair/a ~ table / a ~ bed** laxlayan stul/stol/çarpayı; 2. *məc.* qətiyyətsiz, səbatsız, zəif; **~ steps** qətiyyətsiz addımlar; **to be ~ in *one's* belief** inamında səbatsız olmaq; 3. əsən, titrəyən, titrək; **~ hands** əsən/titrəyən əllər; **a ~ voice** titrək/titrəyən səs; 4. davamsız, tezsınan, tezdağılan; etibarsız; şübhəli; 5. zəif; **to feel ~** özünü zəif hiss etmək;
◊ **to be ~ on *one's* pins** ayaqlarının üstündə möhkəm dayanmamaq

**shall** [ʃæl] *tam forma;* [ʃəl, ʃl, ʃ] *qısa formalar (inkar forması* **shall not**, *qısa inkar forması* **shan't** [ʃa:nt]; *pt* **should** [ʃud]; *inkar forması* **should not**; *qısa inkar forması* **shouldn't** [ʃudnt]) 1. *köməkçi fel 1-ci şəxsin tək və cəmində işlənir; gələcək zamanı ifadə edir və Azərbaycan türkcəsində təkdə* **-cam, -cəm**; *cəmdə* **-caq, -cək** *şəkilçilərinə müvafiq gəlir; I* **shall** *read this book in summer Mən bu kitabı yayda oxuyacam; I* **shall** *go to the country tomorrow Mən sabah kəndə gedəcəm; We* **shall** *receive a letter from him Biz ondan məktub alacağıq; We* **shall** *help them Biz onlara kömək edəcəyik*; 2. *modal fel olaraq:* 1) *2-ci və 3-cü şəxslərdə işlənir və hədə, vəd, yasaq və s. bildirir: You shall be punished for your behaviour Sən/Siz hərəkətinə/ hərəkətinizə görə cəzalanacaqsan/cəzalanacaqsınız; You shall have the book tomorrow Sən/Siz kitabı sabah alacaqsan/alacaqsınız*; 2) *Hərəkətin vacibliyini/ lazımlılığını bildirir: Shall I come here tomorrow? Mən sabah bura gəlimmi?; Shall I read the text? Mətni oxuyummu?* 3) *Birinci şəxs tək və cəmdə işlənərək qətiyyət bildirir: I shall return Mən hökmən qayıdacam; We shall get the money back Biz pulu geri alacağıq (hökmən)*

**shallow** [ˈʃælou] *adj (-er, -est)* 1. dayaz; **~ water** dayaz su; **a ~ plate/pool** dayaz boşqab/ çarhovuz; 2. səthi, dayaz, məhdud; boş; **a ~ report** səthi məruzə; **~ mind** məhdud ağıl; **a ~ person** məhdud/dayaz adam; **~ policy** dayaz siyasət; **~ argument 1)** əsassız arqument/dəlil; 2) boş mübahisə;
◊ *Where the water is shallow, no vessel will ride Su dayaz olan yerdə gəmi gedə bilməz; Shallow streams/ waters make most din at.söz.*
≅ *Boş dağarcıq bərk səs salar*

**shallowness** [ˈʃælounɪs] *n* 1. dayazlıq; 2. ağılın/dərrakənin məhdudluğu

**sham¹** [ʃæm] *n* 1. saxtalaşdırma, saxtasını düzəltmə; saxtakarlıq; saxtakarlıq etmə; qəlp, saxta; *Are those real diamonds or only shams? Onlar əsl brilyantdır, yoxsa saxta?*; 2. hiyləgər, riyakar, özünü tülkülüyə qoyan adam, simulyant; *He's not ill, he is a sham O, xəstə deyil, özünü tülkülüyə qoyur*; 3. fırıldaqçı, dələduz, adamaldadan, yalançı; *He cheated you, he is a sham O səni/sizi aldatdı, o fırıldaqçıdır/dələduzdur*

**sham²** [ʃæm] *adj* 1. saxta, qəlp, saxtalaşdırılmış; **~ pearls/ jewellery** saxta mirvari/daş-qaş; **~ papers** saxta/ saxtalaşdırılmış sənədlər; **~ marriage** saxta kəbin; 2. süni; yalançı; **~ flowers** süni güllər/çiçəklər; **~ simplicity** süni sadəlik; **~ tears** yalançı göz yaşları

**sham³** [ʃæm] *v* **(-mm-)** riyakarlıq etmək, yalandan özünü ...göstərmək/...vurmaq/...oxşatmaq, ...kimi qələmə vermək; **to ~ ill** yalandan özünü xəstə kimi göstərmək; **to ~ dead** yalandan özünü ölülüyə vurmaq; *He is not ill, he is shamming O, xəstə deyil, özünü xəstəliyə vurur*; **to ~ stupid** özünü axmaqlığa/gicliyə vurmaq

**shaman** [ˈʃæmən] *n (pl* **shamans)** şaman *(falçı, cadugər, cindar)*

**shamanism** [ˈʃæmənɪzm] *n* şamanlıq *(ruhlara, magiyaya sitayiş – ibtidai din formalarından biri)*

**shamble** [ˈʃæmbl] *v* ayaqlarını sürümək, yavaş-yavaş getmək/ yerimək

**shame¹** [ʃeɪm] *n* 1. xəcalət, həya, abır, abır-həya; **a sense of ~** xəcalət/həya hissi; **for ~** xəcalətdən; **to feel ~ at *smth.*** bir şeydən xəcalət çəkmək/abır-həya etmək; *He felt shame at having told a lie O, yalan söylədiyinə görə xəcalət çəkdi*; **to burn/to flush with ~** xəcalətdən qızarmaq; **to have no ~, to be without ~** abırsız/həyasız olmaq, abrı-həyası olmamaq; **to be lost to ~** abır-həyasını itirmək; 2. biabırçılıq, rüsvayçılıq, bədnamlıq, üzüqaralıq; **to bring ~ on/to/upon *one's* family** ailəsinə üzüqaralıq gətirmək, ailəsini biabır etmək; **to bring to ~** biabır/rüsvay etmək; *For shame! Eyib olsun! Utan!/Utanın!*; **a child of ~** kəbinsiz/qeyri-qanuni doğulmuş uşaq; *What a shame Heyf! Heyf ki! Əfsus ki*;
◊ **the last ~** həbsxana, qazamat

**shame²** [ʃeɪm] *v* 1. utandırmaq, utanmaq, xəcalət çəkmək; **to ~ *smb.* in front of/before *smb.*** bir kəsi bir kəs qarşısında utandırmaq; *His kindness shamed me Onun mehribanlığı mənə xəcalət verdi, Mən onun mehribanlığından utandım*; 2. biabır/rüsvay/bədnam etmək; ləkələmək; **to ~ *one's* family** ailəsini biabır/rüsvay etmək; **to ~ oneself** özünü biabır/rüsvay/bədnam etmək

**shamefaced** [ˌʃeɪmˈfeɪst] *adj* 1. utancaq, utanan; 2. qorxaq, ürəksiz, ağciyər

**shamefacedly** [ˌʃeɪmˈfeɪstlɪ] *adv* utana-utana, sıxıla-sıxıla, utanaraq, sıxılaraq; çəkinə-çəkinə, qorxa-qorxa

**shamefacedness** [ˌʃeɪmˈfeɪstnɪs] *n* utancaqlıq; cəsarətsizlik, ürəksizlik, qorxaqlıq

**shameful** [ˈʃeɪmfl] *adj* 1. eyibli, biabırçı, rüsvayçı; utanmalı; 2. qalmaqalçı, davakar, cəncəl; namussuz, şərəfsiz, abırsız

**shameless** [ˈʃeɪmlɪs] *adj* 1. abırsız, həyasız, utanmaz; **a ~ liar** abırsız/utanmaz yalançı; 2. ədəbsiz, nalayiq; **a ~ play** ədəbsiz/nalayiq pyes; **a ~ picture** ədəbsiz/nalayiq şəkil

**shamelessly** [ˈʃeɪmlɪslɪ] *adv* həyasız, həyasızcasına, həyasız-həyasız, ədəbsiz, ədəbsizcəsinə, nəzakətsiz, utanmadan

**shamelessness** [ˈʃeɪmlɪsnɪs] *n* abırsızlıq, həyasızlıq, utanmazlıq

**shammy** [ˈʃæmɪ] *n* zamşa *(yumşaq maral dərisi)*

**shampoo¹** [ʃæmˈpu:] *n* 1. şampun *(baş, xalça və s. yumaq üçün maye sabun)*; **a perfumed ~** ətirli şampun; *Don't use too much shampoo Çox şampun işlətmə/işlətməyin*; 2. başı yuma *(şampunla)*; **to have a ~** başı şampunla yumaq

**shampoo²** [ʃæmˈpu:] *v (pt, pp* **-pooed**; *pr.p.* **-pooing)** saçı, xalçanı və s. şampunla yumaq

**shamrock** [ˈʃæmrɔk] *n* 1. *bot.* dovşan kələmi; 2. üçyarpaqlı yonca/bitki; 3. üçyarpaqlı yonca *(İrlandiyanın emblemi)*

**shandy** [ˈʃændɪ] *n* şəndi *(pivə, limonad və ya zəncəfil qatışığından ibarət içki)*

**shank** [ʃæŋk] *n* 1. ayaq; 2. baldır; 3. *anat.* ayaq darağı; 4. gövdə *(bitkilərdə)*; 5. mil, ox *(lövbərdə, avarda)*; 6. *amer.* qalıq, qalıq hissə;
◊ **~ of the being** toran, axşamın başlanğıcı

**shan't** [ʃa:nt] **shall not** *birləşməsinin qısa forması*

**shanty¹** [ˈʃæntɪ] *n* I koma, daxma

**shanty** [ˈʃæntɪ] *n* II *dənizçilərin xorla oxuduğu iş mahnısı*

**shanty²** [ˈʃæntɪ] *v* komada/daxmada yaşamaq

**shape¹** [ʃeɪp] *n* 1. forma, ümumi şəkil; **a round /square ~** girdə/kvadrat forma; **the ~ of his nose** onun burnunun forması; **to have the ~ of *smth.*** bir şeyin formasında olmaq; **in the ~ of a box** qutu formasında; **a cake in the ~ of a heart** ürək formalı/şəkilli pirojna; **to take the ~ of *smth.*** bir şeyin formasını almaq; *The piece of clay took the shape of a vase Gil parçası vaza şəkli aldı*; **to give *smth.* a different ~** bir şeyə cürbəcür forma vermək; 2. qayda, düzülüş, düzüm; **to put/to get/to knock *smth.* into ~** bir şeyi qaydaya salmaq/qoymaq; **to put *one's* ideas into ~** fikirlərini qaydaya salmaq; *You may read your paper when you get it into shape Sən/Siz məruzəni/məruzənizi qaydaya salandan sonra oxuya bilərsən/bilərsiniz*; 3. kölgə, kabus; *Strange shapes appeared from the shadows Qaranlıqdan əcaib kölgələr peyda oldu*; 4. *d.d.* vəziyyət; **in good/in bad ~** yaxşı/pis vəziyyətdə; *His affairs are in (a) good/in (a) bad shape Onun işləri yaxşı/pis vəziyyətdədir*; 5. idman forması; **to be in good/in bad ~** yaxşı/pis formada olmaq; 6. nümunə, model; forma; qəlib;
◊ **to travel on *one's* ~** fırıldaqla/dələduzluqla yaşamaq

**shape²** [ʃeɪp] *v* 1. formalaşdırmaq, forma vermək, formaya salmaq; **to ~ into a ball** şar şəklinə/formasına salmaq; 2. düzəltmək, hazırlamaq, qayırmaq; **to ~ a vase out of clay** gildən vaza düzəltmək/qayırmaq; **to ~ a figure out of wood** ağacdan fiqur düzəltmək/hazırlamaq; 3. qoşmaq, bəstələmək; **to ~ a poem** şer qoşmaq; **to ~ a song** mahnı bəstələmək/qoşmaq; 4. qaydaya salmaq, hazırlamaq; **to ~ *one's* ideas** fikirlərini qaydaya salmaq; **to ~ an answer** cavab hazırlamaq; **to ~ a plan** plan hazırlamaq; 5. formalaşmaq, forma kəsb etmək; ortaya çıxmaq, əmələ gəlmək; *The boy/The girl is shaping quickly Oğlan/qız tez formalaşır*; 6. **(to)** uyğunlaşdırmaq; *We must shape our plans to our abilities Biz planlarımızı bacarığımıza/qabiliyyətimizə uyğunlaşdırmalıyıq*;
◊ **to ~ a coat for the moon** ≅ xəyalpərəstliklə məşğul olmaq

**shaped** [ʃeɪpt] *adj* 1. formalı, şəkilli; **~ like a pear** armud formalı, armudvarı, armudşəkilli, armudu; 2. *mürəkkəb sözlərin komponenti: Azərbaycan türkcəsində* **-oxşar, -şəkilli, -forma, -varı** *komponentlərinə müvafiq gəlir:* eggshaped yumurtaşəkilli, yumurtavarı, yumurtayaoxşar; pearshaped armudşəkilli, armudaoxşar

**shapeless** [ˈʃeɪplɪs] *adj* 1. formasız, şəkilsiz, forması/şəkli olmayan; 2. biçimsiz, eybəcər, kifir, idbar, yöndəmsiz; 3. nizamsız, qarma-qarışıq, dağınıq

**shapelessness** [ˈʃeɪplɪsnɪs] *n* 1. formasızlıq, şəkilsizlik, biçimsizlik; 2. çirkinlik, eybəcərlik

**shapely** [ˈʃeɪplɪ] *adj* **(-ier, -iest)** boylu, qamətli, biçimli; qədd-qamətli; qəşəng; **a ~ figure** biçimli fiqura; **~ legs** qəşəng/biçimli qıçlar

**share¹** [ʃeəʳ] *n* 1. pay, hissə; ***one's* ~ of the expenses** xərcdə payı; **to get *one's* ~ due of *smth.*** bir şeydən payını almaq; *He got his full share O, payını tam aldı; She can have my share of the cake O mənim pirojna payımı götürə bilər*; 2. rol, iştirak; **to have/to take *one's* ~ in *smth.*** bir şeydə iştirak etmək; *What share did he have in this success? Bu nailiyyət-*

*də onun rolu nə oldu? He had no share in the plot Bu sui-qəsddə o iştirak etməmişdi*

**share²** [ʃeəʳ] *v* **1.** bölmək, paylamaq; **to ~ smth. equally** bir şeyi bərabər bölmək; **to ~ smth. among five men** bir şeyi beş adam arasında bölmək; *Share the chocolates among the children Şokoladı uşaqlar arasında böl/bölün*; **to ~ one's bread with smb.** çörəyini bir kəslə bölmək; **2.** iştirak etmək *(bir şeydə)*; bölüşdürmək; **to ~ (in) the expenses** xərclərdə iştirak etmək; **to ~ responsibility** məsuliyyəti bölüşdürmək; *He shares responsibility O da məsuliyyət daşıyır*; **3.** payı olmaq; **to ~ the spoils** qənimətdə payı olmaq; **4.** şərik olmaq *(dərdə, kədərə və s.)*; **to ~ smb.'s hardships** bir kəsin çətinliklərinə şərik olmaq; **to ~ out** bölmək, bölüşdürmək, paylamaq

**shareholder** [ˈʃeə.houldəʳ] *n* aksioner, səhmdar

**sharer** [ˈʃeərəʳ] *n* = **shareholder**

**shark¹** [ʃa:k] *n* **1.** *zool.* akula *(yırtıcı balıq)*; **2.** *məc.* vəhşi, yırtıcı; **3.** fırıldaqçı, kələkbaz, haramzadə, dələduz; şantajçı, hədə ilə/zorla başqasından pul qoparan adam; **4.** gömrük məmuru

**shark²** [ʃa:k] *v* **1.** fırıldaqçılıq/ dələduzluq/ hiyləgərlik/ kələkbazlıq/biclik etmək, fırıldaq işlətmək; **2.** acgözlüklə yemək, aşırmaq

**sharp¹** [ʃa:p] *n* **1.** *d.d.* dələduz, fırıldaqçı, kələkbaz; **2.** *d.d.* yaxşı bilən/tanıyan, bələd *(adam)*

**sharp²** [ʃa:p] *adj* (-er, -est) **1.** iti; **a ~ knife** iti bıçaq; **~ scissors** iti qayçı; **a ~ angle** iti bucaq; **2.** yonulmuş, çərtilmiş, qədlənmiş; **a ~ pencil** yonulmuş/çərtilmiş /qədlənmiş karandaş; **3.** kəskin; **~ slop/decent/ascent** kəskin meyl/eniş/yoxuş; **~ fall** kəskin azalma/enmə; **4.** dəqiq, aydın; **~ contrast** dəqiq/kəskin təzad; **~ distinctions** aydın fərqlər; *I caught a sharp view of them Mən onları aydınca gördüm*; **5.** güclü, bərk, kəskin; **~ frost** bərk/kəskin/güclü şaxta; **~ wind** bərk/güclü külək; **~ pain** bərk/kəskin ağrı; **6.** ağıllı, zəkalı, kamallı, fərasətli, düşüncəli; **a ~ child** ağıllı/fərasətli uşaq; **a ~ answer** ağıllı cavab; **7.** cəld, diribaş, zirək, çevik, bacarıqlı, fəndgir; bic, mahir; **a ~ lawyer** *d.d.* zirək/çevik/bacarıqlı vəkil; **8.** acı; turş, turşumuş; **the ~ smell of decaying vegetables** çürüməkdə olan tərəvəzin turşumuş iyi; **~ wine** turş şərab/çaxır; **9.** qulaqbatırıcı, qulaqbatıran *(səs və s.)*; **~ voice** qulaqbatırıcı səs; **10.** zərif, incə; iti; **~ eyes** iti gözlər; **a ~ nose/sense of smell** güclü iybilmə duyğusu; **11.** zəhərli, acı, toxunan; **~ words** acı/toxunan sözlər; **a ~ tongue** acı dil; *She has a sharp tongue Onun dili acıdır*; **12.** cəld, tez, sürətli; **~ steps** cəld/iti addımlar; **13.** amansız; **a ~ battle/struggle** amansız döyüş /mübarizə;

◊ **as ~ as a needle** çox ağıllı/dərrakəli/zəkalı; **~ as the corner of a round table** gic, səfeh, axmaq, sarsaq; *All things that are sharp are short at.söz. ≅ Tez alışan, tez sönər*

**sharp³** [ʃa:p] *adv* **1.** düz, lap; **at ten o'clock ~** düz saat onda; *The train left sharp in time Qatar düz/lap vaxtında yola düşdü; Please be here at five sharp Zəhmət olmasa, düz saat beşdə burada ol/olun*; **2.** sərt/kəskin surətdə, birdən; **to turn ~ round** birdən/kəskin surətdə dönmək; **to stop ~** birdən dayanmaq

**sharpen** [ˈʃa:pən] *v* **1.** itiləmək; **to ~ a knife/an axe** bıçaq/balta itiləmək; **2.** çərtmək, qədləmək, yonmaq; **to ~ a pencil** karandaş qədləmək/yonmaq; **3.** kəskinləşdirmək, gərginləşdirmək, şiddətləndirmək; kəskinləşmək, şiddətlənmək; *The pain sharpened Ağrı kəskinləşdi*; **4.** sürətləndirmək, cəldləşdirmək, yeyinlətmək; *The man sharpened his pace Kişi addımlarını sürətləndirdi*;

◊ **to ~ one's tools** hazırlaşmaq *(bir işi görməyə)*

**sharpener** [ˈʃa:pnəʳ] *n* **1.** bülöv, bülöv daşı; **2.** çarx *(bıçaq və s. itiləmək üçün)*

**sharply** [ˈʃa:plı] *adv* **1.** kəskin, kəskin tərzdə; *The road bends sharply Yol kəskin tərzdə dönür/əyilir*; **2.** diqqətlə; *She looked at me sharply O mənə diqqətlə baxdı*

**sharpness** [ˈʃa:pnıs] *n* **1.** kəskinlik, qətilik; **2.** itilik; **the ~ of a knife** bıçağın itiliyi

**sharp-eyed** [.ʃa:pˈaıd] *adj* itigözlü, itigörən

**sharpshooter** [ˈʃa:pʃutəʳ] *n* mahir atıcı *(tüfəngdən və s.)*

**sharp-sighted** [ˈʃa:pˈsaıtıd] *adj* = **sharp-eyed**

**sharp-tongued** [ˈʃa:pˈtʌŋd] *adj* ağzını xeyrə açmayan, xeyirdanışmaz, həmişə şər/pisliyə danışan

**sharp-toothed** [ˈʃa:pˈtu:θt] *adj* itidişli, iti dişi olan

**sharp-witted** [ˈʃa:pˈwıtıd] *adj* ağıllı, zəkalı, dərrakəli

**shatter¹** [ˈʃætəʳ] *n* qırıntı, xırda hissə/parça; **to break into/to ~s** xıncım-xıncım/tikə-tikə/parça-parça etmək; **to tear/to rent into/to ~s** xırda hissələrə/parçalara qırmaq; **to be in ~s** xırda hissələrə parçalanmaq; **to grind glass into ~s** şüşəni xıncım-xıncım etmək/əzib toza döndərmək

**shatter²** [ˈʃætəʳ] *v* **1.** xırdalamaq, parçalamaq, doğramaq, qırmaq, parça-parça/xıncım-xıncım/darmadağın etmək; **to ~ a window** pəncərəni qırmaq/qırıq-qırıq etmək; **2.** qırılmaq, parçalanmaq, parça-parça/qırıq-qırıq olmaq; **3.** pozmaq, xarab etmək, dağıtmaq, sarsıtmaq, korlamaq *(sağlamlığı, əsəb sistemini və s.)*; puça çıxartmaq, alt-üst etmək *(ümidi və s.)*; *His contentment was shattered Onun sakitliyi pozuldu; The girl shattered my confidence in her Qız mənim ona olan inamımı puça çıxartdı/alt-üst etdi*; **4.** tökülmək; *The flowers/The leaves shattered Çiçəklər/Yarpaqlar töküldü*

**shatter-brained** [ˈʃætəbreınd] *adj* **1.** dəli, başsız, ağılsız, gic, başıboş; **2.** fikirsiz, qayğısız, yüngülxasiyyət, dəmdəməki, yelbeyin, yüngül

**shattering** [ˈʃætərıŋ] *adj* **1.** məhvedici, dağıdıcı; **~ blow** məhvedici/dağıdıcı zərbə; **2.** gur, zil, uca *(səs haq.)*; gursəsli; **a ~ trumpet** gursəsli şeypur



**shatter-proof** [ˈʃætəpru:f] *adj* zərbəyədavamlı; **~ glass** zərbəyədavamlı şüşə

**shave¹** [ʃeıv] *n* **1.** qırxma, taraş; **to have a ~** üzünü qırxmaq; *I had a shave before I went out Mən getməzdən əvvəl üzümü qırxdım; A sharp razor gives a close shave İti ülgüc təmiz qırxır*; **2.** yaxınlaşma, toxunmadan yaxına gəlmə; **close/near/narrow ~** təhlükəli/xətərli yaxınlaşma, təhlükədən güclə yaxa qurtarma; **3.** yonqar, talaşa; qabıq *(meyvədə)*; tikə

**shave²** [ʃeıv] *v* *(pt* **shaved** [-d]; *pp* **shaved** *və ya* **shaven** [ˈʃeıvn] qırxmaq, taraş etmək *(həm də* **to ~ off**); **to ~ one's face** üzünü qırxmaq; **to ~ a customer** müştərinin üzünü qırxmaq; *This razor will not shave properly Bu ülgüc yaxşı qırxmır*; **to ~ (off) one's beard** saqqalını qırxmaq; **2.** qırxdırmaq; *He hadn't shaved for a week O, bir həftədir üzünü qırxdırmır*; **3.** kəsmək *(nazik dilimlərə)*; **4.** yonmaq, qazımaq, biçmək, çalmaq *(otu)*; **5.** yüngülcə toxunmaq; *The car shaved the kerb Avtomobil yüngülcə səkiyə toxundu*

**shaven¹** [ˈʃeıvn] *adj* qırxılmış, taraş edilmiş; **~ heads/faces** qırxılmış başlar/üzlər

**shaven²** [ˈʃeıvn] **to shave** *felinin pp forması*

**shaver** [ˈʃeıvəʳ] *n* **1.** dəllək, bərbər; **2.** ülgüc; **an electric ~** elektrik ülgücü

**shaving** [ˈʃeıvıŋ] *n* qırxma, taraş

**shaving-brush** [ˈʃeıvıŋbrʌʃ] *n* qırxma/taraş üçün kist

**shaving-cream** [ˈʃeıvıŋkri:m] *n* qırxma/taraş üçün krem, taraş kremi

**shavings** [ˈʃeıvıŋz] *n* yonqar; *The floor of the carpenter's shop was covered with wood shavings Dülgərin emalatxanasının döşəməsi taxta yonqarı ilə örtülmüşdü*

**shawl¹** [ʃɔ:l] *n* şal, yaylıq

**shawl²** [ʃɔ:l] *v* şal örtmək, şalla örtünmək, şala bürünmək

**she¹** [ʃi:] *n* qız, dişi; *Is the baby a he or a she? Uşaq oğlandır ya qız? What a lovely dog – is it a he or she? Nə gözəl itdir – o erkəkdir ya dişi?*

**she¹** [ʃi:] *tam forması;* [ʃı] *qısa forması pers. pron* o *(üçüncü şəxs təkdə, qadın cinsi üçün)*; *I see a woman She is in the yard Mən bir qadın görürəm O, həyətdədir*

**she-** [ʃi:-] *mürəkkəb sözlərin komponenti: bəzi heyvanların cinsini bildirmək üçün işlənir: Azərbaycan türkcəsində* **dişi** *sözünə müvafiq gəlir:* **she-bear dişi** ayı; **she-wolf dişi** canavar

**sheaf¹** [ʃi:f] *n (pl* **sheaves)** **1.** bağlama, dəstə, paçka *(pul, kağız)*; **a ~ of paper** bir paçka kağız; **2.** dərz; şələ; **a ~ of wood** bir şələ odun

**sheaf²** [ʃi:f] *v* dərz bağlamaq, şələ vurmaq *(həm də* **to ~ up)**

**shear** [ʃıəʳ] *v (pt* **sheared**; *pp* **shorn** [ʃɔ:n] *və ya* **sheared) 1.** qırxmaq *(qoyunu və s.)*; **to ~ sheep** qoyun qırxmaq; **2.** budamaq *(ağacı)*; tutmaq *(dırnağı)*; kəsmək *(saçı)*; **3.** məhrum etmək, əlindən almaq; **4.** *şair.* doğramaq, çapmaq, kəsmək; *The sword shore its way Qılınc doğrayıb özünə yol açdı*

**shearer** [ˈʃıərəʳ] *n* **1.** qoyunqırxan; qırxıcı *(qırxıcı maşında işləyən fəhlə)*; **2.** otçalan, kərəntiçi, biçinçi

**shearing** [ˈʃıərıŋ] *n* qırxım *(qoyunları qırxma)*

**shears** [ʃıəz] *n* qırxılıq, qayçı; **gardening ~** bağ qayçısı *(iki əllə tutulan)*

**sheath** [ʃi:θ] *n* **1.** qın; **to put the sword back in its ~** qılıncı qınına qoymaq; *He put the sword back in its sheath O, qılıncı qınına qoydu*; **2.** örtük; **the ~ round an electric cable** elektrik kabelinin örtüyü; **3.** dar, bədənə yapışan qadın paltarı; **4.** kondon *(cinsi əlaqə zamanı istifadə edilən qoruyucu vasitə)*

**sheathe** [ʃi:ð] *v* **1.** qına qoymaq; **to ~ the sword 1)** qılıncı qına qoymaq; **2)** *məc.* müharibəni kəsmək; **2.** futlyara qoymaq, çexol çəkmək; **3.** örtmək, bürümək *(insanı, bədənin bir hissəsini)*; **4.** kütləşdirmək *(ağrını)*

**sheathless** [ˈʃi:ðlıs] *adj* **1.** qınsız; **2.** futlyarsız, örtüksüz, açıq

**she'd** [ʃi:d] *d.d.* **she had** *birləşməsinin qısa forması*

**shed¹** [ʃed] *n* **1.** çardaq, talvar, anbar, mərək, dam; samanlıq; **a coal-~** kömür anbarı; **a cattle-~** mal damı; **a wood-~** odun çardağı/damı; **2.** qaraj, depo

**shed²** [ʃed] *v (-dd-; pt, pp* **shed)** I çardağın/talvarın altına yığmaq, qaraja/anbara qoymaq

**shed** [ʃed] *v (-dd-; pt, pp* **shed)** II **1.** tökmək; dəyişmək; *Many trees shed their leaves in autumn Çox ağaclar payızda yarpaqlarını tökür; This snake sheds its skin every year Bu ilan hər il qabığını dəyişir*; **2.** axıtmaq, tökmək *(göz yaşı, qan)*; **to ~ tears** göz yaşı axıtmaq/tökmək; **to ~ blood** qan axıtmaq/tökmək; **3.** çıxartmaq; *She shed her wet clothes and dried herself O, yaş paltarlarını çıxartdı və qurulandı*; **4.** yaymaq, saçmaq; *The candle shed a soft glow over the room Şam otağa zəif işıq saçdı*

**sheen** [ʃi:n] *n* parıltı; parlaqlıq; **the ~ of silk** ipəyin parıltısı/parlaqlığı; *A shampoo can give your hair a beautiful sheen Şampun sənin/sizin saçına/saçınıza gözəl parlaqlıq verə bilər*

**sheep** [ʃi:p] *n (tək və cəm forması eynidir)* **1.** qoyun; **a flock of ~** bir sürü qoyun; **2.** qorxaq/cəsarətsiz/ağciyər adam; **3.** səfeh, sarsaq, axmaq, gic *(adam)*;

◊ **to follow like ~** kor-koranə izləmək; **to make ~'s eyes at smb.** bir kəsə qoyun kimi baxmaq; **to separate the ~ from the goat** yaxşını yamandan/xeyri şərdən ayırmaq; **a wolf in ~'s clothing** qoyun dərisi geyinmiş canavar/qurd; **~' eye** aşiqanə baxış; **to cast/to make ~'s eyes at smb.** bir kəsə aşiqanə nəzər salmaq/göz-qaş etmək

**sheepdog** [ˈʃi:pdɔg] *n* çoban/qoyun iti; ovçarka
**sheepish** [ˈʃi:pɪʃ] *adj* **1.** utancaq; qorxaq, ürəksiz, ağciyər, cəsarətsiz; **with a ~ smile** utana-utana gülümsəyərək; *She came into the room looking sheepish O utana-utana otağa daxil oldu*; **2.** gicbəsər, gictəhər
**sheepishly** [ˈʃi:pɪʃlɪ] *adv* **1.** utana-utana, qısıla-qısıla, çəkinə-çəkinə; **2.** gic/axmaq/gicbəsər kimi, axmaqcasına, səfehcəsinə
**sheepishness** [ˈʃi:pɪʃnɪs] *n* **1.** utancaqlıq; qorxaqlıq, cəsarətsizlik, ürəksizlik; **2.** axmaqlıq, səfehlik, giclik, sarsaqlıq, ağılsızlıq
**sheep-louse** [ˈʃi:pˈlaus] *n (pl* **-lice** [-laɪs]) qoyun biti
**sheepman** [ˈʃi:pmən] *n (pl* **-men** [-mən]) **1.** *amer.* qoyunçu, qoyunçuluq mütəxəssisi; qoyun fermasının sahibi; **2.** *arx.* çoban
**sheepskin**[1] [ˈʃi:pskɪn] *n* qoyun dərisi
**sheepskin**[2] [ˈʃi:pskɪn] *adj* qoyun dərisindən tikilmiş/ hazırlanmış; **a ~ coat** qoyun dərisindən tikilmiş palto; **~ gloves** qoyun dərisindən hazırlanmış əlcək
**sheer**[1] [ʃɪər] *adj* həqiqi, tam; *It is sheer nonsense Bu tam cəfəngiyyatdır*
**sheer**[2] [ʃɪər] *v* **1.** *dən.* kursdan kənara çıxmaq; **2.** vurnuxmaq, özünü ora-bura vurmaq
**sheer**[3] [ʃɪər] *adv* tamamilə, büsbütün, qətiyyən; heç
**sheet** [ʃi:t] *n* **1.** mələfə, döşəkağı; **2.** çexol; örtük; **3.** kəfən; **4.** vərəq *(kağız və s.)*; **a ~ of paper** bir vərəq kağız; **5.** səhifə; **the following ~s** sonrakı səhifələr; **6.** qat, qaysaq;
◊ **a clean ~ 1)** qüsursuz/nöqsansız xidmət; **2)** ləkəsiz ad/şöhrət; *The rain is coming down in sheets ≅ Şırə-boran yağış yağır, Leysan yağır*
**shelf** [ʃelf] *n* I *(pl* **shelves) 1.** rəf, ləmə, taxça; **a ~ of books** bir rəf kitab; **to put/to place/to set books on the ~** kitabları rəfə qoymaq/yerləşdirmək/düzmək; **2.** çıxıntı; **a ~ of rock** qaya çıxıntısı;
◊ **to be on the ~ 1)** təxirə salınmaq; **2)** qız qalıb qarımaq; **3)** həbs altında olmaq; **4)** ayaqlarını uzadıb ölmək
**shelf** [ʃelf] *n* II *(pl* **shelves)** *coğ.* şelf *(qitənin sualtı davamı)*
**shell**[1] [ʃel] *n* I **1.** balıqqulağı, ilbiz qabığı; **snail ~** ilbiz qabığı; **2.** qabıq; **chickens in the ~** yumurtadan çıxmamış cücələr; **3.** zireh, dəmir geyim *(qədimdə)*; **4.** tısbağa; **5.** tabut; **6.** *geol.* yer qabığı;
◊ **to go /to retire into *one's* ~** öz qınına çəkilmək, öz qınından bayıra çıxmamaq, cəmiyyətdən uzaqlaşmaq; **to come out of *one's* ~** qabığından çıxmaq
**shell** [ʃel] *n* II **1.** mərmi, güllə *(top üçün)*; **2.** mina
**shell**[2] [ʃel] *v* I **1.** qabıqdan çıxartmaq, qabığı təmizləmək/ soymaq, qərzəkləmək; **to ~ an egg** yumurtanın qabığını təmizləmək/soymaq; **to ~ peas/beans/ seeds/ grain** noxudun/ lobyanın/toxumun/taxılın qabığını almaq/ təmizləmək; **2.** soyulmaq, qabıq vermək, qabıqdan çıxmaq, qabığı soyulmaq/tökülmək
**shell** [ʃel] *v* II topa tutmaq; **to ~ a town/a road** şəhəri/yolu topa tutmaq; *The troops were shelling unceasingly Ordu arasıkəsilmədən toplardan atəşə tutuldu*
**she'll** [ʃi:l] **she will** *birləşməsinin qısa forması*
**shellfish** [ˈʃelfɪʃ] *n (tək və cəmi eyni olaraq işlənir)* molyusk *(onurğasız yumşaqbədənli heyvan)*
**shelter**[1] [ˈʃeltər] *n* **1.** sığınacaq, daldalanacaq; dam; **to afford/to grant/to give ~** sığınacaq vermək; **to deny ~** sığınacaq/daldalanacaq verməkdən imtina etmək; **to find ~** sığınacaq/ daldalanacaq tapmaq; **2.** gizlənmə, gizlətmə; müdafiə; **to find/to take ~** gizlənmək; **to give ~** gizlətmək; müdafiə etmək; **to seek/to take/to find ~ from the rain under a rock/under a tree** qayanın/ağacın altında yağışdan gizlənmək; **3.** himayə; **under the ~ of the government** hökumətin himayəsində; *He took me under his shelter O məni öz himayəsinə aldı/götürdü*; **4.** yetimxana; **a ~ for the poor** kasıblar üçün yetimxana; **5.** koma, daxma *(şaxdan, kürəkdən tikilmiş)*; çardaq; **~ of straw and leaves** saman və yarpaqlardan tikilmiş koma
**shelter**[2] [ˈʃeltər] *v* **1.** sığınacaq vermək, sığındırmaq, saxlamaq; **to ~ *smb.* for the night** bir kəsə bir gecəlik sığınacaq vermək, bir kəsi bir gecə saxlamaq; **2.** qorumaq, gizlətmək; **to ~ *smb.* from pursuit in a house** bir kəsi evdə izlənilməkdən gizlətmək; **3.** sığınacaq tapmaq; **to ~ from the storm in a house** tufandan bir evdə sığınacaq tapmaq; **4.** müdafiə/himayə etmək; **to ~ swindlers** fırıldaqçıları/dələduzları müdafiə/himayə etmək; *A rock sheltered us from the rain/the wind Bir qaya bizi yağışdan /küləkdən müdafiə etdi*; **5.** qorumaq; **to ~ crops** əkini qorumaq; **6.** gizlənmək; **to ~ oneself behind /under a rock** qayanın arxasında/altında gizlənmək; *I sheltered myself in the crowd Mən izdihamın içində gizləndim*; **7.** xilas etmək, qurtarmaq; **to ~ *smb.* from blows** bir kəsi zərbədən xilas etmək; **to ~ *smb.* from punishment** bir kəsi cəzadan xilas etmək/qurtarmaq
**shelterless** [ˈʃeltəlɪs] *adj* yurdsuz, evsiz, daldalanacaqsız; müdafiəsiz, köməksiz, kimsəsiz; **to pass the night ~** gecəni çöldə/bayırda keçirmək
**shelve** [ʃelv] *v* I yavaş-yavaş aşağı enmək /düşmək; *The beach shelves gently (down) to the sea Çimərlik yavaş-yavaş dənizə tərəf enir*
**shelve** [ʃelv] *v* II **1.** rəfə qoymaq/düzmək/yerləşdirmək; **to ~ books** kitabları rəfə qoymaq/yerləşdirmək; **2.** təxirə salmaq; **to ~ the business** işi təxirə salmaq; **3.** vəzifədən çıxartmaq/kənarlaşdırmaq; **to ~ an official** məmuru vəzifədən çıxartmaq; **to ~ oneself** vəzifədən uzaqlaşmaq; **4.** rəf düzəltmək *(şkafda və s.)*
**shelves** [ʃelvz] **shelf** *isminin cəm forması*
**shepherd**[1] [ˈʃepəd] *n* **1.** çoban; naxırçı; **2.** keşiş
**shepherd**[2] [ˈʃepəd] *v* **1.** otarmaq, örüşə aparmaq; *The boys were shepherding up in the mountain Oğlanlar dağda qoyun otarırdılar*; **2.** çıxartmaq, aparmaq, keçirmək; *She shepherded the children out of the room O, uşaqları otaqdan çıxartdı; A guide shepherded us in to the musum Bələdçi bizi muzeyə apardı*
**sherbet** [ˈʃə:bət] *n* şərbət *(içki)*; **to drink a cup of ~** bir fincan şərbət içmək
**sheriff** [ˈʃerɪf] *n* şerif *(İngiltərədə və ABŞ-da: yüksək inzibati vəzifə sahibi)*
**sherifdom** [ˈʃerɪfdəm] *n* şerif vəzifəsi; şeriflik
**she's** [ʃi:z] *d.d.* **she is** *birləşməsinin qısa forması*
**shield**[1] [ˈʃi:ld] *n* **1.** qalxan; **2.** *məc.* müdafiə, müdafiəçi; **a ~ against criticism** tənqidə qarşı müdafiə;
◊ **the other side of the ~** məsələnin digər/başqa tərəfi
**shield**[2] [ˈʃi:ld] *v* **1.** müdafiə etmək; **to ~ *one's* eyes with *one's* hand** gözünü əli ilə müdafiə etmək; **2.** xilas etmək, qorumaq; **to ~ from danger** təhlükədən xilas etmək; *The police officer shielded the child with his body Polis zabiti uşağı bədəni ilə qorudu*
**shift**[1] [ʃɪft] *n* **1.** yerdəyişmə, yerini dəyişmə; köçmə, mühacirət; **population ~** əhalinin yerdəyişməsi/ köçməsi/mühacirəti; **a ~ to a new house** yeni evə köçmə; **a gradual ~ of the population away from the villages to the towns** əhalinin tədricən kəndlərdən şəhər köçməsi; **2.** növbə; **day/night ~** gündüz/gecə növbəsi; **to be on the day/night ~ at the factory** fabrikdə gündüz/gecə növbəsində işləmək; *I work on the day/night shift at the plant Mən zavodda gündüz/gecə növbəsində işləyirəm; The night shift has/have just come off duty Gecə növbəsi indicə işini qurtarıb*; **3.** növbələşmə; dəyişmə; **a ~ in the direction of the wind** küləyin istiqamətinin dəyişməsi; **a ~ in the public opinion** ictimai rəydə/fikirdə dəyişmə; **4.** düz, dar qadın paltarı; **5.** hiylə, kələk, biclik, fənd
**shift**[2] [ʃɪft] *adj* növbəli, növbə ilə işləyən; **~ work** növbəli iş; **~ workers** növbə ilə işləyən fəhlələr
**shift**[3] [ʃɪft] *v* **1.** yerini dəyişmək, başqa yerə köçürmək; dəyişdirmək; **to ~ *one's* position /*one's* place/*one's* lodging** vəziyyətini/yerini/mənzilini dəyişmək; **to ~ *one's* ground** nöqteyi-nəzərini dəyişmək **to ~ furniture from one room to another** mebeli bir otaqdan başqasına köçürmək; *The wind shifted from east to north Külək şərqdən şimala dəyişdi; The wind shifted and blew the mist away Külək dəyişdi və dumanı dağıtdı*; **2.** dəyişmək; **to ~ a burden from one hand to another** yükü bir əlindən başqasına dəyişmək; **to ~ *one's* glance/gaze** baxışının/nəzərinin istiqamətini dəyişmək; **to ~ the target** *harb.* hədəfi dəyişmək; **3.** *tex.* ötürücüsünü dəyişmək *(hərəkəti maşının bir hissəsindən o biri hissəsinə ötürən mexanizm)*; **4.** qoymaq *(günahı, məsuliyyəti və s.)*; **to ~ the blame/the responsibility on to *smb.*** günahı/məsuliyyəti bir kəsin üzərinə qoymaq; **5.** götürmək; *Shift this rubbish out of the way Bu zir-zibili yoldan götür/götürün*; **6.** biclik/hiylə işlətmək, bicliyə/hiyləyə/kələyə əl atmaq; **to ~ away** gizlicə getmək, qaçıb gizlənmək, yox olmaq, gözdən itmək; **to ~ off 1)** təxirə salmaq; **2)** boyun qaçırmaq; **to ~ off the fulfilment of the payment** xərci ödəməkdən imtina etmək/boyun qaçırmaq; **to ~ off the fulfilment of a duty** borcu (vəzifəni) yerinə yetirməkdən boyun qaçırmaq/imtina etmək
**shifter** [ˈʃɪftər] *n* bic/kələkbaz/hiyləgər/fırıldaqçı/cüvəllağı adam
**shifting**[1] [ˈʃɪftɪŋ] *n* dəyişmə; **~ of scenes** dekorasiyanın/ səhnənin dəyişməsi; **~ of seasons** fəsillərin dəyişməsi
**shifting**[2] [ˈʃɪftɪŋ] *adj* **1.** dəyişən; hərəkət edən; **~ sand** dəyişən/hərəkət edən qum; **2.** diribaş, cəld, zirək, çevik, bacarıqlı, fəndgir, bic
**shift-key** [ˈʃɪftki:] *n* klaviş; dil, toxmaqcıq *(piano-da, yazı makinasında və s.)*
**shiftless** [ˈʃɪftlɪs] *adj* **1.** bacarıqsız, aciz, naçar, qabiliyyətsiz; **2.** tənbəl, fəaliyyətsiz; **3.** boş, əbəs, bihudə, mənasız, səmərəsiz; **4.** çılpaq, lüt, soyunmuş, soyundurulmuş
**shiftlessly** [ˈʃɪftlɪslɪ] *adv* boş/bihudə/mənasız bir tərzdə; səmərəsiz olaraq
**shifty** [ˈʃɪftɪ] *adj* **1.** bic, cəld, çevik; *He's a shifty old fox O, bic qoca tülküdür*; **2.** namussuz, şərəfsiz; **~ methods** şərəfsiz metodlar; **3.** etibarsız, dəyanətsiz, dəyişkən, səbatsız; **~ principles** səbatsız/dəyişkən prinsiplər; *He has shifty principles O, prinsipsizdir/səbatsızdır/ etibarsızdır*
**shilling** [ˈʃɪlɪŋ] *n* **1.** şillinq *(funt sterlinqin 20-də birinə bərabər Britaniya pul vahidi)*; **2.** *Keniyada, Uqandada və Tanzaniyada əsas pul vahidi*
**shilly-shally**[1] [ˈʃɪlɪ.ʃælɪ] *n* qərarsızlıq, qətiyyətsizlik, mütərəddidlik
**shilly-shally**[2] [ˈʃɪlɪ.ʃælɪ] *adj* qərarsız, qətiyyətsiz, mütərəddid
**shilly-shally**[3] [ˈʃɪlɪ.ʃælɪ] *v d.d.* tərəddüd etmək, qərarsızlıq/səbatsızlıq göstərmək
**shilly-shally**[4] [ˈʃɪlɪ.ʃælɪ] *adv* tərəddüdlə, qəti olmayaraq, mütərəddid bir surətdə/tərzdə
**shim** [ʃɪm] *n tex.* ara/aralıq qat
**shimmer**[1] [ˈʃɪmər] *n* parıldama, parıltı, titrək işıq vermə; titrəmə, sayrışma; **the ~ of pearls/silk** mirvarilərin/ ipəyin parıltısı
**shimmer**[2] [ˈʃɪmər] *v* sayrışmaq, titrək işıq saçmaq, parlamaq, parıldamaq, parıltı vermək; *The stars were shimmering through the mist Ulduzlar dumanın arasından sayrışırdı; The frozen ponds shimmered like polished steel Donmuş göllər cilalanmış polad kimi parlayırdı*

**shin**[1] [ʃın] *n anat.* baldır
**shin**[2] [ʃın] *v* **(-nn-)** dırmaşmaq *(həm də* **to ~ up)**; **to ~ up a tree** ağaca dırmaşmaq
**shin-bone** ['ʃınboun] *n anat.* baldır sümüyü
**shinding** ['ʃındıŋ] *n d.d.* 1. şənlik; səs-küylü qonaqlıq; 2. rəqs
**shindy** ['ʃındı] *n* 1. səs-küy, hay-haray, dava-dalaş, çaxnaşma, hay-küy, qaçaqaç, vəlvələ; **to kick up a ~** dava-dalaş/vəlvələ salmaq; 2. şənlik, əyləncə
**shine**[1] [ʃaın] *n* 1. işıq, parlama, işıq saçma; **the ~ of a lamp/of a lantern/of a torch** lampanın/fənərin/məşəlin işığı; **the bright ~ of the fire** ocağın parlaq işığı; **the ~ of the sun/of the moon/of stars** günəşin/ayın/ulduzların işıq saçması; 2. parıltı, parlaqlıq; **the ~ of gold/of silk** qızılın/ipəyin parıltısı
**shine**[2] [ʃaın] *v (pt, pp* **shone** [ʃɔun]) 1. parlamaq; **to ~ with happiness** xoşbəxtlikdən parlamaq; *Gold shines in the sun Qızıl günəşdə parlayır; The sun/The moon shines Günəş/Ay parlayır;* 2. işıq saçmaq; *A lamp /A candle shines Lampa/Şam işıq saçır; The sun shone down upon meadow Günəş çəmənliyə işıq saçırdı;* 3. seçilmək, fərqlənmək; **to ~ in society** cəmiyyətdə seçilmək/ fərqlənmək; **to ~ down** qabağını kəsmək/tutmaq; kölgədə qoymaq/buraxmaq; *She shone me down O məni kölgədə qoydu;* **to ~ out** seçilmək, fərqlənmək
**shingle**[1] ['ʃıŋgl] *n* I 1. *tik.* qont *(damların üstünü örtmək üçün ensiz nazik taxtalar)*; nazik taxta; 2. qısa qadın saç vurumu/düzümü
**shingle** ['ʃıŋgl] *n* II 1. *top. i* çınqıl, xırda çaydaşı, çaylaq/buzlaq daşı, qaya parçası; 2. cınqıllı/daşlı sahil
**shingle**[2] ['ʃıŋgl] *v* 1. *tik.* qontla/nazik taxta ilə örtmək; 2. saçı qısa vurdurmaq/qırxdırmaq
**shingly** ['ʃıŋglı] *adj* çınqıllı, xırda daşlı; **a ~ beach** çınqıllı çimərlik/plyaj
**shining** ['ʃaınıŋ] *adj* 1. parlaq, parlayan, işıqlı; **~ scales** parlayan axça/pul; **a ~ button** parlaq/parıldayan düymə; **a ~ helmet** parıldayan dəbilqə/dəmir papaq; **the ~ sun** parlaq/parıldayan günəş; **a ~ example** parlaq misal; 2. nəşə/sevinc saçan, fərəhli, sevincli; **a ~ smile** nəşəsaçan təbəssüm; **a ~ face** sevincli/fərəhli üz; 3. məşhur, görkəmli; mühüm; **~ merits** mühüm xidmətlər
**shiny** ['ʃaını] *adj* 1. aydın, günəşli, təmiz; **a hot, ~ day** isti günəşli gün; 2. parlayan, parıldayan; **~ buttons/ boots/pans** parlayan düymələr/çəkmələr/qazanlar; *She has a shiny nose Onun burnu parıldayır;* 3. sürtülmüş; **a ~ coat/dress** sürtülmüş palto/paltar
**ship**[1] [ʃıp] *n* gəmi; **a broad-bottomed ~** yastıdibli gəmi; **a cargo ~** yük gəmisi, yükdaşıyan gəmi; **a merchant ~** ticarət gəmisi; **sister ~s 1)** eyninövlü gəmilər; 2) eyni kompaniyaya/şirkətə məxsus (olan) gəmilər; **to go by ~** gəmi ilə getmək;
◊ **~ of the desert** səhra gəmisi, dəvə
**ship**[2] [ʃıp] *v* **(-pp-)** 1. gəmi ilə yük yola salmaq/göndərmək; **to ~ goods by rail** malı dəmir yolu ilə yola salmaq/göndərmək; 2. yükləmək *(gəmini)*; mindirmək *(gəmiyə)*; *The goods were shipped at London Mal Londonda yüklənmişdi;* 3. yüklənmək *(gəmi haq.)*; gəmiyə minmək /oturmaq; **to ~ for Scotland** Şotlandiyaya gedən gəmiyə minmək;
◊ **to ~ *smb./smth.*** bir kəsi/şeyi göndərmək; **to ~ soldiers to the colonies** əsgərləri müstəmləkələrə göndərmək; *The children were shipped off to boarding-school at an early age Uşaqları kiçik yaşlarında internat məktəbə göndərdilər*
**-ship** [-ʃıp] *suff Mürəkkəb isim düzəltmək üçün işlədilir. Azərbaycan türkcəsində* **-lıq, -lik, -luq, -lük** *şəkilçilərinə uyğun gəlir:* craftsman**ship** usta**lıq**; friend**ship** dost**luq**, hard**ships** çətin**liklər**; member**ship** üzv**lük**
**shipbuilder** ['ʃıp.bıldəʳ] *n* gəmiqayıran, gəmiqayırma mütəxəssisi, gəmi inşaatçısı
**shipbuilding**[1] ['ʃıp.bıldıŋ] *n* gəmiqayırma, gəmi inşaatı
**shipbuilding**[2] ['ʃıp.bıldıŋ] *adj* gəmiqayırma; gəmi; **the ~ industry** gəmiqayırma sənayesi; **a ~ dock** gəmi tərsanəsi *(gəmi qayrılan və təmir olunan yer)*
**shipless** ['ʃıplıs] *adj* gəmisiz, gəmi olmayan; **a ~ port/dock** gəmi olmayan liman/tərsanə
**ship-load** ['ʃıploud] *n* 1. gəmi yükü; 2. yük tutumu *(gəminin)*
**shipmate** ['ʃıpmeıt] *n* dənizçi yoldaşı
**shipment** ['ʃıpmənt] *n* 1. yük; **~ in bulk** qablanmamış yük; 2. yükləmə, yükvurma, yüklənmə
**ship-of-war** ['ʃıpəv'wɔ:] *n* hərbi gəmi
**shipowner** ['ʃıp.ounəʳ] *n* gəmi sahibi
**shipper** ['ʃıpəʳ] *n* 1. yük/mal göndərən; 2. yük *(dənizlə göndərilməyə əlverişli)*; *Wheat is a good shipper Buğda gəmi ilə göndərilməyə əlverişli yükdür*
**shipping**[1] ['ʃıpıŋ] *n* 1. dəniz donanmasının gəmiləri; **scarcity of ~** gəminin çatışmazlığı; 2. hər hansı bir limanın və ya ölkənin gəmiləri; 3. donanmanın yükdaşıma qabiliyyəti; 4. yükləmə, yola salma *(yükü)*; 5. gəmiçilik
**shipping**[2] ['ʃıpıŋ] *adj* 1. yükləmə, yükvuran, yükvurma; **~ documents** yükləmə/yükvurma sənədləri; **~ instructions** yükləmə/yükvurma təlimatları; **a ~ company** yükvuran/gəmiçilik şirkəti; 2. naviqasiya, gəmiçilik; **~ season** naviqasiya/gəmiçilik mövsümü; 3. gəmi ilə daşıma; **the ~ of oil from the Middle East** Yaxın Şərqdən neftin gəmi ilə daşınması
**ship-rat** ['ʃıpræt] *n* gəmi siçovulu
**shipshape** ['ʃıpʃeıp] *adj* səliqəli, təmiz, təmizkar; **in a ~ manner** diqqətlə, səliqə ilə; *It took us a long time to get the room shipshape after the*



*party Qonaqlıqdan sonra otağı səliqəyə salmaq bizim xeyli vaxtımızı aldı*
**shipwreck**[1] ['ʃıprek] *n* gəmi qəzası; gəminin batması; **to suffer ~** qəzaya uğramaq, batmaq *(gəmi haq.)*; 2. gəmi qırıntıları
**shipwreck**[2] ['ʃıprek] *v (adət. məchulda işlənir)* 1. qəzaya uğratmaq; **to ~ a vessel** gəmini qəzaya uğratmaq/batırmaq; 2. *arx.* var-yoxdan çıxarmaq, iflasa səbəb olmaq; həlak/məhv/tələf etmək; **to ~ a bank** bankın iflasına səbəb olmaq; **to ~ plans/hopes** planları/ümidləri məhv etmək; 3. iflasa/müvəffəqiyyətsizliyə uğramaq
**shipyard**[1] ['ʃıpja:d] *n* verf, tərsanə *(gəmi qayrılan və təmir edilən yer)*, gəmiqayırma/gəmi inşaatı zavodu
**shipyard**[2] ['ʃıpja:d] *adj* tərsanə, gəmi zavodu; **~ workers** tərsanə fəhlələri; gəmiqayırma zavodu fəhlələri
**shirk**[1] [ʃə:k] *n* işdən yayınan adam
**shirk**[2] [ʃə:k] *v* 1. qaçmaq, yayınmaq, boyun qaçırmaq; **to ~ fighting** mübarizədən boyun qaçırmaq; **to ~ work** işdən yayınmaq; **to ~ responsibility** məsuliyyətdən boyun qaçırmaq/ qaçmaq; 2. **(onto, upon)** *amer.* başqasının boynuna/üzərinə qoymaq; **to ~ *one's* obligation onto/upon *smb.* else** öz vəzifəsini/borcunu başqa birinin üzərinə/boynuna qoymaq; 3. *arx.* aldatmaq, biclik/kələkbazlıq etmək, fırıldaq işlətmək/gəlmək
**shirt** [ʃə:t] *n* köynək *(kişilər üçün)*; **a clean ~** təmiz köynək; **to put on a ~** köynək geyinmək; **a short-sleeved ~** qısaqol köynək;
◊ **to keep *one's* ~ on** sakitləşmək, özünü ələ almaq, hövsələsini basmaq; *Keep your shirt on! It was only a joke Özündən/Özünüzdən çıxma/çıxmayın! Bu sadəcə olaraq zarafat idi*
**shirty** ['ʃə:tı] *adj d.d.* acıqlı, hirsli, qeyzli; **a ~ man** acıqlı/ hirsli/qeyzli adam; **to get ~** acıqlanmaq/hirslənmək; *Don't get shirty with me! Mənə acıqlanma!/ acıqlanmayın!*
**shit**[1] [ʃıt] *n tab.* nəcis, pox; **to have/to need a ~** sıçmağı gəlmək, sıçmaq istəmək
**shit**[2] [ʃıt] *v* **(-tt-**; *pt, pp* **shitted** *və ya* **shat)** *tab.* batırmaq, sıçmaq; **to ~ oneself** özünü batırmaq; *The child shitted himself Uşaq özünü batırdı;* **to ~ *one's* trousers** şalvarını batırmaq, sıçıb şalvarını batırmaq
**shiver**[1] ['ʃıvəʳ] *n* I titrəmə, titrəyiş, əsmə, lərzə, ürpəşmə; **to give a ~** titrətmək, lərzəyə salmaq
**shiver** ['ʃıvəʳ] *n* II *adət. pl* qəlpə, qırıntı, qırıq, parça; **to break/to smash into/in ~s** qırıq-qırıq/parça-parça etmək
**shiver**[2] ['ʃıvəʳ] *v* I əsmək, titrəmək, lərzəyə gəlmək, ürpəşmək; **to ~ with cold** soyuqdan əsmək /titrəmək; **to ~ with fear** qorxudan əsmək/titrəmək; **to ~ inwardly from head to foot** bütün bədəni əsmək/ürpəşmək/ lərzəyə gəlmək
**shiver** ['ʃıvəʳ] *v* II 1. parça-parça/qırıq-qırıq etmək; **to ~ a vase/a mirror/a plate** güldanı/güzgünü/boşqabı qırıq-qırıq etmək; 2. sınmaq, qırılmaq; qırıq-qırıq/parça-parça olmaq
**shivers** ['ʃıvəz] *n*: **the ~** ürəkkeçmə əsməsi/titrəyişi; **to get/to have the ~** dəhşətdən lərzəyə gəlmək/ sarsılmaq/ titrəmək
**shivery** ['ʃıvərı] *adj* I 1. əsən, titrəyən *(soyuqdan, qorxudan, xəstəlikdən)*; 2. soyuq; **a ~ winter day** soyuq qış günü
**shivery** ['ʃıvərı] *adj* II kövrək, tezsınan; **~ stone** kövrək/tezsınan daş; **~ ice** kövrək/tezsınan buz
**shoal**[1] [ʃoul] *n* I 1. sürü, dəstə, karvan, qatar; **a ~ of wolves** bir sürü qurd/canavar; **a ~ of fish** balıq dəstəsi/karvanı; **by ~** dəstə ilə, dəstə-dəstə, sürü-sürü, sürü ilə; 2. yığın; çoxlu, çox; **a ~ of people** bir yığın adam; **a ~ of boats/of motor-cars** çoxlu qayıq/avtomobil; **to get letters in ~s** çoxlu məktub almaq
**shoal** [ʃoul] *n* II 1. dayaz yer, dayazlıq; **the deeps and ~s** dərin və dayaz yerlər; **to circumvent a ~** dayaz yerin yanından keçmək; **to encounter a ~** dayazlığa rast gəlmək; 2. banka *(dənizin dibində olan hündürlük)*
**shoal**[2] [ʃoul] *adj* dayaz, suyu az olan; **~ water** dayazlıq, dayaz su
**shoal**[3] [ʃoul] *v* I bir yerə yığılmaq/toplanmaq *(balıq haq.)*
**shoal** [ʃoul] *v* II 1. azalmaq *(su haq.)*; 2. boşaltmaq *(suyu)*; 3. *dən.* dayaz yerə girmək
**shoaling** ['ʃoulıŋ] *n* 1. dayazlaşma; 2. dayazlıq, dayaz yer
**shock**[1] [ʃɔk] *n* 1. zərbə; **terrific/sudden/violent ~** dəhşətli/qəfil/güclü zərbə; **to absorb/to cushion a ~** zərbəni udmaq/yumşaltmaq; 2. toqquşma; **the ~ of arms** silahların toqquşması, silahlı toqquşma; 3. təkan; **earthquake ~** zəlzələ təkanı; 4. sarsıma, sarsıntı; *His death was a shock to me Onun ölümü mənim üçün sarsıntı oldu, Onun ölümü məni sarsıtdı*
**shock**[2] [ʃɔk] *v* 1. *(adət. məchul növdə işlənir)* sarsıtmaq; **to ~ profoundly/morally** bərk/mənəvi cəhətdən sarsıtmaq; **to be ~ed at/by the news** xəbərdən sarsımaq; 2. pərt olmaq/etmək, utandırmaq, xəcalət çəkmək; **to be ~ed to hear *smth.*** bir şeyi eşitməkdən pərt olmaq/xəcalət çəkmək; 3. vurmaq; zərbə endirmək
**shocked** [ʃɔkt] *adj* 1. sarsımış, sarsıdılmış; 2. hiddətlənmiş, qəzəblənmiş
**shocker** ['ʃɔkəʳ] *n* 1. yaramaz nümunə; 2. bulvar romanı
**shocking** ['ʃɔkıŋ] *adj* 1. çox pis/çirkin, iyrənc; mənfur; **a ~ weather** çox pis/iyrənc hava; **~ behaviour** iyrənc/çox pis davranış; **~ words** iyrənc sözlər; 2. dəhşətli, amansız; **~ cruelty** dəhşətli/amansız qəddarlıq; **~ news** dəhşətli xəbər
**shockproof** ['ʃɔkpru:f] *adj (xüs. saat haq.)* zərbəyədavamlı; **a ~ watch** zərbəyədavamlı saat
**shoe**[1] [ʃu:] *n* 1. tufli, yarımbotinka; **high ~s 1)** çəkmə, botinka; 2) *amer.* uzunboğaz çəkmə; **low ~s**

*amer.* yarımbotinka; **jumping ~s** *id.* tullanma üçün tufli; **to cast/to fling an old ~ after** *smb.* **1)** köhnə ayaqqabını bir kəsin dalınca atmaq *(xoşbəxtlik əlaməti olaraq)*, ≅ bir kəsin dalınca su atmaq; 2) *məc.* bir kəsə xoşbəxtlik/uğur arzulamaq; 2. nal; 3. *tex.* ayaqqabı qəlibi; başmaq;

◊ **to be in** *smb.'s* **~s** bir kəslə eyni vəziyyətdə olmaq, bir kəsin vəziyyətində olmaq; **to know where the ~ pinches** çətinliyin nədən ibarət olduğunu bilmək; məsələnin nə yerdə olduğunu anlamaq; **to die in** *one's* **~s** asılmaq, zorakılıqla öldürülmək; *d.d.* əldə ölmək; **to put the ~ on the right foot** ədalətlə hərəkət etmək; **to shake in** *one's* **~s** qorxudan titrəmək/əsmək

**shoe²** [ʃu:] *v (pt, pp* **shod** [ʃɔd]; *pr.p* **shoeing)** nallamaq, nal vurmaq; **to ~ a horse/a mule** at/qatır nallamaq; *A man who shoes horses is called a farrier Atları nallayan adama nalbənd deyirlər;*

◊ **to ~ the goose 1)** boş-boşuna/bihudə vaxt keçirmək; 2) doyunca içmək, sərxoş olmaq

**shoeblack** [ˈʃu:blæk] *n* ayaqqabısilən, çəkməsilən

**shoebox** [ˈʃu:bɔks] *n* 1. ayaqqabı qutusu; 2. balaca/kiçik otaq

**shoeboy** [ˈʃu:bɔı] *n* = **shoeblack**

**shoe-brush** [ˈʃu:brʌʃ] *n* çəkmə/ayaqqabı şotkası

**shoehorn** [ˈʃu:hɔ:n] *n* dabançəkən, dabangeydiron, dabandan

**shoeing¹** [ˈʃu:ıŋ] *n* nallama

**shoeing²** [ˈʃu:ıŋ] *adj* nal; **a ~ hammer** nal çəkici, nallamaq üçün çəkic

**shoelace** [ˈʃu:leıs] *n* qaytan, bağ *(ayaqqabı üçün)*; *Tie your shoelaces Qaytanlarını/ Qaytanlarınızı bağla/bağlayın*

**shoeless** [ˈʃu:lıs] *adj* 1. ayaqyalın, yalınayaq; 2. ayaqqabısız

**shoemaker** [ˈʃu:meıkəʳ] *n* çəkməçi; pinəçi

**shoemaking** [ˈʃu:meıkıŋ] *n* çəkməçilik; pinəçilik

**shoeshine** [ˈʃu:ʃaın] *adj* çəkməsilən; **a ~ boy** çəkməsilən oğlan

**shoe-string** [ˈʃu:strıŋ] *n* 1. = **shoelace**; 2. *amer. d.d.* kiçik məbləğ pul; **to travel round the world on a ~** az məbləğ pulla dünyanı səyahət etmək

**shone** [ʃoun] **to shine** *felinin pt, pp formaları*

**shoo** [ʃu:] *v (pt, pp* **shooed)** qorxudub qaçırmaq, qovmaq *(quşu, uşaqları)*; *Shoo, all of you, I'm busy Hamınız çıxıb gedin, mən məşğulam*

**shook¹** [ʃuk] *n k.t.* qotman, dərz, ot qalağı

**shook²** [ʃuk] **to shake** *felinin pt forması*

**shoot¹** [ʃu:t] *n* I 1. ov; *The shoot is good here Ov burada yaxşıdır*; 2. ov yerləri; 3. ovçular dəstəsi/qrupu; 4. güllə atma yarışı; 5. sıçrama, sıçrayış; **a ~ up/back/ down/forward** yuxarı/geri/aşağı/qabağa sıçrayış; 6. *id.* bərk zərbə; **a ~ for goal** qapıya zərbə *(futbolda, hokkeydə)*; 7. tutma; **a ~ of pain/of colic/of toothache** ağrı/sancı/diş ağrısı tutması; 8. qıjov, çayın/selin iti axan yeri; 9. şəlalə; şırşır;

◊ **to get the ~** qovulmaq, qovlanmaq; **to give the ~** bir kəsi işdən qovmaq

**shoot** [ʃu:t] *n* II 1. böyümə, inkişaf etmə, boy atma; 2. *bot.* zoğ, cavan budaq; **tender ~s in spring** cavan yaz budaqları/zoğları; 3. *zool.* artma, artım, çoxalma; **an animal ~ on a deer's antler** maral buynuzunun illik artımı; 4. qol, şaxə; **the ~s of the Alps** Alp dağlarının qolları

**shoot²** [ʃu:t] *v (pt, pp* **shot** [ʃɔt]) I 1. atəş açmaq, atmaq *(tüfəng və s.)*; vurmaq, öldürmək *(tüfənglə və s.)*; **to ~ off/with a rifle/of/with a gun** silahdan/tüfəngdən atəş açmaq; **to ~ well/badly /straight** yaxşı/pis/düz atəş açmaq; **to ~ an arrow from a bow** kamandan ox atmaq; *Don't shoot – I surrender Atəş açma/açmayın – Mən təslim oluram; He shot an arrow from his bow O, kamanından bir ox atdı*; 2. yaralamaq, öldürmək *(güllə ilə)*; **to ~** *smb.* **in/through the leg** bir kəsi ayağından yaralamaq; **to ~** *smb.* **in/through the head** bir kəsi başından vurub öldürmək; 3. güllələmək; **to ~** *smb.* **dead** bir kəsi güllələyib öldürmək; 4. vurmaq *(güllə ilə)*; **to ~ a bird flying** quşu uçarkən/havada vurmaq *(güllə ilə)*; **to ~** *smb.* **for a spy/for a deserter** bir kəsi casus kimi/fərari kimi güllələmək; 5. ov etmək, ovlamaq; **to ~ game** ov quşları ovlamaq; **to ~ lions** aslan/şir ovlamaq; **to be out ~ing** ova çıxmaq, ovda olmaq; *He fishes but he doesn't shoot O, balıq tutur, lakin ov ovlamır*; 6. atmaq, tullamaq *(zər, tor)*; **to ~ dice** zər atmaq; **to ~ net** tor atmaq; 7. salmaq *(lövbər)*; **to ~ an anchor** lövbər salmaq; **to ~ a look/a glance** nəzər salmaq; **to ~ a ball/a puck** top/şayba atmaq; 8. şüalanmaq, şüa saçmaq/vermək/buraxmaq; *The sun shoots its beams through the mist Günəş dumanın içindən şüa saçır; The search-light shot a long ray across the sky Projektor səmaya uzun şüa saçdı/buraxdı*; 9. qaçmaq, yüyürmək, sürətlə getmək/qaçmaq; **to ~ through a tunnel** tunelin içi ilə sürətlə yüyürmək/ qaçmaq; 10. fikrə gəlmək, fikirdən keçmək; başa gəlmək; fikirdə doğmaq; *An idea shot across my mind Başıma bir fikir gəldi*; 11. sancmaq, vurmaq; *The pain shoots up the back/the arm/the leg Ağrı belimə/ qoluma/ qıçıma vurur*; 12. boşaltmaq *(yükü)*; **to ~ coal/ore/ timber** kömür/filiz/taxta-şalban boşaltmaq; 13. atmaq; **to ~ rubbish** zibil atmaq; 14. çəkmək, çəkiliş aparmaq; **to ~ a film** film çəkmək; 15. *amer. d.d.* şəkil çəkmək, fotoaparatla şəkil çəkmək; **to ~ ahead 1)** sürətlə/ çaparaq getmək; ötüb keçmək; 2) *id.* irəli atılmaq *(qaçışda, cıdırda və s.)*; **to ~ away 1)** atəşi arasıkəsilmədən davam etdirmək; 2) patron qurtarana qədər atəş açmaq; **to ~ down 1)** güllələmək, vurmaq, öldürmək *(güllə ilə)*; 2) vurmaq *(atəşlə)*; **to ~ down an aircraft** təyyarə vurmaq; **to ~ out 1)** sıçramaq, sıçrayıb çıxmaq; *A boat



shot out from under the bridge Körpünün altından bir qayıq çıxdı*; 2) çıxartmaq; **to ~ one's tongue** dilini çıxartmaq; 3) qoymaq; **to ~ one's arm/one's leg** qolunu/ayağını qoymaq; 4) qabağa çıxmaq; uzanmaq; *The land shoots out into the sea Torpaq/Quru dənizə uzanır*; 5) *id.* vurub xətdən kənara çıxartmaq *(topu)*;

◊ **to ~ an emergency landing** məcburi olaraq yerə enmək; **to ~ a goal 1)** hədəfə düşmək; 2) *məc.* istədiyinə nail olmaq; **to ~ (out)** *one's* **neck** qanmazlıq/ ədəbsizlik/tərbiyəsizlik etmək, özünü həyasızcasına aparmaq; **to ~ the moon** kirayəsini vermədən gecəikən mənzili tərk etmək; **to ~ a line** özünü tərifləmək/öymək, lovğalanmaq, öyünmək; **to ~ into the brown** səhv etmək, yanılmaq

**shoot** [ʃu:t] *v (pt, pp* **shot** [ʃɔt]) II 1. cücərmək, göyərmək; tumurcuqlamaq; *Grass shoots Ot cücərir/göyərir; Trees shoot Ağaclar tumurcuqlayır*; 2. böyümək, boy atmaq; inkişaf etmək; 3. zoğ vermək, zoğlamaq; *Bushes shoot again after being cut Kəsildikdən sonra kollar yenidən zoğ verir*; 4. çıxmaq *(diş haq.)*; *Teeth shoot (up) Dişlər çıxır*; 5. açılmaq *(yarpaq haq.)*; *Leaves shoot Yarpaqlar açılır*; **to ~ up 1)** tez/sürətlə böyümək/artmaq; *A child shoots up Uşaq tez böyüyür; Prices shot up Qiymətlər sürətlə artdı*; 2) yuxarı qalxmaq; *A fountain/A flame shoots up Fəvvarə/Alov yuxarı qalxır*

**shooter** [ˈʃu:təʳ] *n* 1. nişançı, atıcı; 2. snayper *(daha çox top vuran oyunçu)*; 3. *d.d.* odlu silah *(xüs. tapança)*; 4. *id.* sərt verilmiş top

**shooting** [ˈʃu:tıŋ] *n* 1. atəş açma, atış, atma; **to practise ~ at mark** hədəfə atəş açma üzrə məşq etmək; 2. silahla ov etmə *(ov quşlarını)*; **to go for ~** ova getmək; 3. ov etmə hüququ; 4. ov yerləri; 5. kəskin ağrı; **the ~ of a tooth** dişdə kəskin ağrı; 6. *id.* qapıya və ya səbətə atma *(topu)*

**shop¹** [ʃɔp] *n* 1. mağaza, dükan; **grocer's/butcher's/fruit ~** baqqaliyə/ət/meyvə dükanı; **baker's ~** çörək mağazası/ dükanı; **chemist's ~** aptek; **general ~** universal mağaza; **to serve in a ~** dükanda/mağazada işləmək; **to go to the ~** dükana/mağazaya getmək; **to keep (a) ~** dükan/ mağaza saxlamaq, ticarətlə məşğul olmaq; **to set up (a) ~** mağaza/dükan açmaq; **a village ~** kənd dükanı/ mağazası; *The shops in town close at 5.30 Şəhərdəki mağazalar/dükanlar saat 5.30-da bağlanır*; 2. emalatxana, sex; **carpenter's/joiner's ~** dülgər/xarrat emalatxanası; **blacksmith's ~** dəmirçixana

**shop²** [ʃɔp] *v* **(-pp-)** 1. mağazaları gəzmək, bazarlıq etmək; 2. *d.d.* işdən çıxartmaq *(satıcını)*; 3. *jarq.* şeytanlamaq, polisə xəbər/donos vermək; **to ~ around** iş axtarmaq

**shop-assistant** [ˈʃɔpəsıstənt] *n* satıcı

**shop-breaker** [ˈʃɔp,breıkəʳ] *n* mağaza/dükan yaran, mağaza/ dükan oğrusu

**shop-girl** [ˈʃɔpgə:l] *n* mağazada işləyən qız, satıcı qız

**shopman** [ˈʃɔpmən] *n (pl* **-men** [-mən]) 1. satıcı; 2. fəhlə; 3. dükan/mağaza sahibi

**shopper** [ˈʃɔpəʳ] *n* alıcı; müştəri

**shopping** [ˈʃɔpıŋ] *n* bazarlıq, bazarlıq etmə; **to do** *one's* **~** bazarlıq etmək; **to go ~ everyday** hər gün bazarlıq etmək

**shopkeeper** [ˈʃɔpki:pəʳ] *n* dükan/mağaza sahibi

**shopwindow** [ˈʃɔpˈwındou] *n* mağaza/dükan vitrini; **to dress a ~** mağaza vitrinini bəzəmək/tərtib etmək

**shore¹** [ʃɔ:ʳ] *n* I sahil, kənar; dəniz kənarı/sahili, sahilboyu; **foggy ~** dumanlı sahil/dəniz kənarı; **sandy ~** qumlu sahil/dəniz kənarı; **the ~ of the sea/of the lake** dənizin/gölün sahili/kənarı; **to come/to go on ~** sahilə çıxmaq

**shore** [ʃɔ:ʳ] *n* II dayaq, tir, dirək, söykənəcək, istinad

**shore²** [ʃɔ:ʳ] *v* I dayaq vermək/vurmaq, dayaq vurub saxlamaq *(həm də* **to ~ up)**; **to ~ (up) a building/a wall/a tree** binaya/divara/ağaca dayaq vurub saxlamaq

**shoreless** [ˈʃɔ:lıs] *adj şair.* sahilsiz, ucsuz-bucaqsız, sonsuz, nəhayətsiz, hədsiz-hüdudsuz; **the ~ sea** hədsiz-hüdudsuz/nəhayətsiz dəniz; **the ~ ocean** sonsuz/nəhayətsiz/hədsiz-hüdudsuz okean

**shore-line** [ˈʃɔ:laın] *n* sahil xətti

**shoreman** [ˈʃɔ:mən] *n (pl* **-men** [-mən]) 1. dəniz sahili sakini; 2. liman fəhləsi/işçisi

**shorn** [ʃɔ:n] **to shear** *felinin pp forması*

**short¹** [ʃɔ:t] *n* 1. qısalıq, gödəklik; müxtəsərlik, qısa məzmun; 2. qısametrajlı film; **documentary/ cartoon/ feature ~** qısametrajlı sənədli/cizgi/bədii film; 3. *fiz. d.d.* qısa qapanma; 4. *dilç.* qısa sait/heca, qısalıq işarəsi;

◊ **in ~** qısaca, qısaca olaraq, bir sözlə; **for ~** qısalıq üçün/xatirinə; *They called him Tom for short Onlar onu qısaca olaraq Tom adlandırdılar*

**short²** [ʃɔ:t] *adj* **(-er, -est)** 1. qısa; **~ distance /journey** qısa məsafə/səyahət; **a ~ dress/hair** qısa paltar/saç; **a ~ road/rope** qısa yol/ip; **~ life** qısa həyat; **~ rest** qısa istirahət; **a ~ vowel** qısa sait; *My coat is short in the sleeves Mənim paltomun qolları qısadır*; **~ waves** *radio* qısa dalğalar; 2. gödək, alçaq; **a ~ man** gödək adam; **a ~ tree** alçaq ağac; **a ~ tower** alçaq qüllə; 3. kəskin, kobud; **to be ~ with** *smb.* bir kəsə qarşı kobud olmaq; **a ~ answer /person /manner** kobud cavab/adam/xasiyyət; **to speak in ~ accents** kəskin tonla danışmaq; 4. tezsınan, kövrək; **~ metal** kövrək/tezsınan metal;

◊ **a ~ time ago** bu yaxında; **in a ~ time** qısa müddətdə, tez, cəld; **at ~ intervals** qısa fasilələrlə; **~ views** fərasətsizlik, gələcəyi görə bilməmə; **~ sea** sakit dəniz

**short³** [ʃɔ:t] *adv* 1. kəskin/sərt surətdə, birdən, birdən-birə; gözlənilmədən, qəflətən; **to stop** ~ birdən/birdən-birə/qəfildən/qəflətən dayanmaq; **to turn (round)** ~ qəflətən/qəfildən/birdən dönmək; **to pull a horse up** ~ atı qəflətən əyləmək/saxlamaq/dayandırmaq; **to take** *smb.* **(up)** ~ 1) bir kəsin üstünə qəfildən/gözlənilmədən hücum etmək; 2) bir kəsin sözünü kəsmək/ağzında qoymaq; **to break off** ~ 1) gözlənilmədən/qəflətən qurtarmaq/başa çatmaq; 2. vaxtsız, vaxtından əvvəl/qabaq, çox tez; **to cut** *smb.'s* **life** ~ bir kəsin həyatına vaxtsız/vaxtından qabaq son qoymaq, bir kəsi cavan vaxtı öldürmək; **to cut a speech** ~ nitqi vaxtından əvvəl kəsmək; **to cut the speaker** ~ natiqin nitqini vaxtından əvvəl/qabaq kəsmək; 3. qısa, gödək; **to cut a stick/a rope** ~ ağacı/ipi qısa kəsmək; **to cut** *one's* **hair** ~ saçını qısa kəsdirmək/kəsmək; **to cut** *one's* **nail** ~ dırnağını qısa /dərindən kəsmək; **to dress** ~ qısa geyinmək; 4. yaxına; *The shells fell short Mərmilər yaxına düşdü*

**shortage** [ˈʃɔ:tɪdʒ] *n* çatmama, əskik gəlmə; kəsir; azlıq; ~ **of food/of goods/of weapons/of soldiers** ərzaq/ mal/ silah/əsgər azlığı; **food ~s during war** müharibə zamanı ərzaq çatışmazlığı; *Shortage of skilled workers is our main difficulty Bizim əsas/başlıca çətinliyimiz təcrübəli fəhlələrin azlığıdır*

**short-armed** [ˈʃɔ:tˈa:md] *adj* gödəkqol, gödəkqollu

**short-breathed** [ˈʃɔ:tˈbri:ðd] *adj* boğulan, nəfəsi kəsilən, ağır/çətin nəfəs alan

**short-circuit¹** [ˈʃɔ:tˈsə:kɪt] *n el.* qısa qapanma

**short-circuit²** [ˈʃɔ:tˈsə:kɪt] *v el.* 1. qısa qapanmaq; qısa qapanma yaratmaq; *The lights short-circuited when I joind up the wires Mən məftilləri birləşdirəndə qısa qapanma yarandı*; 2. mane olmaq *(bir şeyə)*, məhv etmək *(bir şeyi)*; kəsmək *(bir şeyi)*; **to ~ a country's development** ölkənin inkişafına mane olmaq; **to ~ friendly feelings** dostluq hisslərini kəsmək/hisslərinə son qoymaq

**shortcoming** [ˈʃɔ:tˈkʌmɪŋ] *n* 1. qüsur; *She was aware of her own shortcomings O özünün qüsurlarını bilirdi; In spite of all my friend's shortcomings, I still like him Dostumun bütün qüsurlarına baxmayaraq, mən hələ də onu sevirəm*; 2. çatmama, çatışmazlıq, kəsir, defisit; ziyan; **to compensate for a** ~ kəsiri/ziyanı ödəmək; 3. məhsulun azalması; **a ~ of a crop** məhsul azlığı/qıtlığı, məhsulsuzluq

**shorten** [ˈʃɔ:tn] *v* 1. qısaltmaq, gödəltmək; **to ~ a rope** kəndiri/ipi qısaltmaq; **to ~ a story/a lecture** hekayəni/mühazirəni qısaltmaq; **to ~ a working day** iş gününü qısaltmaq; **to ~ hair by clipping it** kəsərək saçı qısaltmaq/gödəltmək; *His life was shortened by troubles Qayğılar onun həyatını qısaltdı/gödəltdi*; 2. qısalmaq, gödəlmək; *The days are rapidly shortening Günlər sürətlə qısalır/gödəlir; A wet rope shortens Yaş kəndir/ip qısalır*; 3. azaltmaq, kəsmək; **to ~ a ration/a tax** payı/vergini azaltmaq;

◊ **to ~ the arm/the hand of** *smb.* bir kəsin hakimiyyətini məhdudlaşdırmaq

**shorthand¹** [ˈʃɔ:thænd] *n* stenoqrafiya; **to write in** ~ stenoqrafiya üsulu ilə yazmaq

**shorthand²** [ˈʃɔ:thænd] *adj* stenoqrafiya, stenoqrafik; ~ **notes/report** stenoqrafik qeydlər/hesabat; **a ~ writer** stenoqrafist

**shorthanded** [ˈʃɔ:tˈhændɪd] *adj* fəhlə/işçi qüvvəsinə ehtiyacı olan

**shorthander** [ˈʃɔ:t.hændəʳ] *n* stenoqrafist

**shortly** [ˈʃɔ:tlɪ] *adv* 1. tez, tezliklə; **to come/to go** ~ tezliklə gəlmək/getmək; *They will come shortly Onlar tezliklə gələcəklər*; 2. qısa, qısaca, yığcam, bir neçə sözlə; **to tell a story** ~ hekayəni qısaca/yığcam danışmaq; 3. kəskin, kobud; **to answer** ~ kəskin/kobud cavab vermək

**shortness** [ˈʃɔ:tnɪs] *n* 1. qısalıq, gödəklik; **the ~ of the trip/of the conversation** səyahətin/danışığın qısalığı; **for ~, for ~' sake** qısalıq xatirinə, qısaca olaraq; 2. zəiflik; **~ of memory** yaddaşın zəifliyi; **~ of breath** təngnəfəslik, tövşümə, tövşük

**short-range** [ˈʃɔ:trendʒ] *adj* yaxınməsafəli, yaxın məsafəyə uça bilən; **~ missiles** yaxın məsafəyə uça bilən raketlər

**shorts** [ʃɔ:ts] *n (özündən sonra fel cəmdə işlənir)* 1. qısa tuman, trusu; **to wear** ~ trusu geymək; *Woman in shorts will not be allowed into the mosque Gödək tuman geymiş qadınlar məscidə buraxılmaz*; 2. tullantı; **the ~ of tobacco** tütün tullantıları; 3. aztapılan mallar

**short-sight** [ˈʃɔ:tsaɪt] *n* yaxından görmə, uzağı görməmə *(göz zəifliyi)*

**short-sighted** [ˈʃɔ:tsaɪtɪd] *adj* 1. yaxından görən, uzağı görməyən; 2. *məc.* fərasətsiz, gələcəyi görə bilməyən/görməyən; **a ~ politician /leader/person** gələcəyi görə bilməyən siyasətçi/rəhbər/şəxs

**short-term** [ˈʃɔ:ttə:m] *adj* qısamüddətli; **~ loan/agreement** qısamüddətli istiqraz/müqavilə

**short-wave** [ˈʃɔ:tweɪv] *adj rad.* qısadalğalı; **~ set** qısadalğalı radio

**short-witted** [ˈʃɔ:tˈwɪtɪd] *adj* beyinsiz, ağılsız, gic, başıboş

**shot¹** [ʃɔt] *n* 1. atəş; **to take/to fire a** ~ atəş açmaq; **to have/to make a ~ at** *smth.* bir şeyə atəş açmaq; **to make a good** ~ yaxşı/sərrast atəş açmaq, hədəfə düşmək; **to make a bad/a poor** ~ pis atəş açmaq, hədəfə düşməmək; 2. zərbə, atma; **a ~ with a stone** daşla zərbə; 3. atıcı, nişançı; **a good/a bad** ~ yaxşı/pis nişançı; **to be no** ~ əsla atmağı bilməmə; 4. oyunçu; **a good/a bad ~ at golf** yaxşı/pis qolf oyunçusu; 5. *id.* qumbara; **to put the** ~ qumbara atmaq;



◊ **big** ~ *zaraf.* böyük adam; **to take a long** ~ uzaq gələcəyi görmək; **like a** ~ dərhal, o saat, əlüstü

**shot²** [ʃɔt] *v* doldurmaq *(silahı)*; **to ~ a gun** tüfəng doldurmaq

**shot³** [ʃɔt] **to shoot** *felinin pt. pp formaları*

**shotgun** [ʃɔtgʌn] *n* 1. qırma/saçma tüfəngi; 2. *amer.* pulemyot

**shotgun wedding** [ˈʃɔtgʌnˈwedɪŋ] *n* məcburi toy *(kəbinsiz olaraq qadın hamilə olduqda)*

**should** [ʃud] *(tam forma)*; [ʃəd, ʃd, ʃt] *(qısa formaları)*; **shall** *felinin pt forması*; 1. *Köməkçi fel kimi aşağıdakı hallarda işlədilir:* 1) *baş cümlədəki feli keçmiş zamanda işlənmiş tabeli mürəkkəb cümlənin tamamlıq budaq cümləsində. Bu halda* **should** *feli Azərbaycan türkcəsinə gələcək zaman şəkilçiləri ilə tərcümə edilir; I said that I* **should** *return soon Mən dedim ki, (mən) tezliklə qayıdacam; We promised that we* **should** *help them Biz söz verdik ki, (biz) onlara kömək edəcəyik;* 2) *baş cümlədə birinci şəxs təkdə felin şəxs formasını düzəltmək üçün. Bu halda* **should** *feli Azərbaycan türkcəsinə felin şərt şəkilçisi vasitəsilə tərcümə edilir; I* **should** *tell her everything if I saw her Onu görsəydim (görsə idim) (mən) ona hər şeyi danışardım; We* **should** *go there if we were invited Biz dəvət olunsaydıq (olunsa idik), ora gedərdik;* 3) *məqsəd budaq cümlələrində:* **lest, that, so that** *bağlayıcılarından sonra; I gave him the book so that he* **should** *study the subject Mən kitabı ona verdim ki, o məsələni öyrənsin;* 4) *şərt budaq cümlələrində; If I* **should** *be free tomorrow, I'll come Sabah boş olsam, gələcəm; If he* **should** *ask you, tell him the truth Əgər o səndən/sizdən soruşsa, həqiqəti ona danış/danışın;* 5) *güzəşt budaq cümlələrində: Whatever sum* **should** *be received from him Məbləğ necə olsa da, onu ondan al/alın;* 6) *Hərəkətin vaciblikdən və ya onun (yəni hərəkətin) kiminsə iradəsindən, qərarından, arzusundan və s. dən asılı olduğu tamamlıq budaq cümlələrində: They proposed/ demanded/ ordered that a special committee* **should** *be set up Onlar təklif/tələb/əmr etdilər ki, xüsusi komissiya təşkil edilsin; It is important that they* **should** *learn about it Onların bu barədə bilmələri vacibdir;* 2. *Modal fel kimi aşağıdakı mənaları bildirir:* 1) *məsləhət, vaciblik, gərəklik; You* **should** *consult a doctor Sən/Siz həkimə müraciət etməlisən/etməlisiniz;* 2) *yerinə yetirilməmiş təklifi, məsləhəti, arzunu: Bu halda* **should** *felindən sonra* **perfect** *(bitmiş) məsdər işlədilir: You* **should** *really* **have been** *more careful Sən/Siz həqiqətən də gərək daha diqqətli olaydın/olaydınız; He hasn't brought the book, though he should have done it last week O, kitabı gətirməyib, halbuki onu keçən həftə gətirməli idi;* 3) *güman, ehtimal, fərz: They* **should** *be at home by now Onlar indilərdə evdə olmalıdırlar;* 4) *arzu: I* **should** *like... Mən istərdim ki,...* 5) *təəccüb, heyrət, hiddət, qəzəb, şübhə: Why should you suspect me? Sən/Siz nə üçün məndən şübhələnməlisən/şübhələnməlisiniz; Why he should behave like that? O nə üçün belə hərəkət etməlidir, How should I know? Mən haradan bilməliyəm?*

**shoulder¹** [ˈʃouldəʳ] *n* 1. çiyin; **~ to ~** çiyin-çiyinə; **right/left ~** sağ/sol çiyin; **to look back over** *one's* ~ çiyini üzərindən geri baxmaq; **to dislocate** *one's* ~ çiynini burxutmaq; 2. kürək, kürək hissəsi *(cəmdəyin)*; **a ~ of mutton** qoyun ətinin kürək hissəsi; 3. *dən.* burtik *(körpüyə dayəndə sürtünməmək üçün qayıqlara bayırdan vurulan tir)*; 4. kənar, qıraq *(yol haq.)*;

◊ **a ~ of mutton fist** yekə yumruq; **a ~ of mutton sail** üçkünc yelkən; **to have broad ~s** güclü/qüvvətli olmaq; **to shift the blame/the responsibility to other ~s** günahı/ məsuliyyəti başqasının boynuna qoymaq; **to give/to turn/to show ~ to** *smb.* bir kəsi soyuq qarşılamaq, bir kəsə soyuq münasibət göstərmək

**shoulder²** [ˈʃouldəʳ] *v* 1. çiyinə götürmək/almaq; **to ~ a burden/a bundle** yükü/bağlamanı çiyinə götürmək/almaq; **to ~** *one's* **rifle** 1) tüfəngini çiyninə götürmək/almaq; 2) orduya/ əsgərliyə getmək; 2. qəbul etmək, (öz) üzərinə götürmək; **to ~ responsibility** məsuliyyəti üzərinə /boynuna götürmək; 3. çiyni ilə itələmək; çiyni ilə toxunmaq; **to ~** *smb.* **into the room** bir kəsi çiyni ilə itələyib otağa salmaq; *He shouldered the police officer aside O, çiyni ilə polis zabitini kənara itələdi*

**shoulder-bag** [ˈʃouldəbæg] *n* çiyin çantası

**shoulder-blade** [ˈʃouldəbleɪd] *n anat.* kürək

**shoulder-high** [ˈʃouldəhaɪ] *adj* çiyin hündürlükdə/hündürlüyündə; **a ~ wall** çiyin hündürlükdə divar

**shouldn't** [ˈʃoudnt] **should not** *birləşməsinin qısa forması*

**shout¹** [ʃaut] *n* qışqırıq, qışqırtı, haray, çığırtı, bağırtı; **cheerful** ~ sevinc ifadə edən qışqırtı/çığırtı; **~s of alarm** həyəcan qışqırtıları/hayları; **wild** ~ çox güclü/şiddətli qışqırıq/qışqırtı; **to give a** ~ qışqırmaq, çığırmaq, bağırmaq, qışqırtı/bağırtı/haray salmaq; **~s of despair** ümidsizlik harayı/bağırtısı; **~s of joy** sevinc qışqırığı/ bağırtısı

**shout²** [ʃaut] *v* 1. qışqırmaq, bağırmaq, çığırmaq; **to ~ loudly** ucadan qışqırmaq/bağırmaq/ çığırmaq; **to ~ at the top of** *one's* **lungs** var gücü ilə qışqırmaq/ çığırmaq/bağırmaq; **to ~ with pain** ağrıdan qışqırmaq/ bağırmaq; **to ~ for/with joy** sevincdən qışqırmaq; **to ~ at** *smb.* bir kəsin üstünə qışqırmaq; **to ~ oneself hoarse** səsi batana qədər qışqırmaq/ bağırmaq; 2. çağırmaq, haraylamaq; **to ~ for help/for assistance** 1) kö-

mөyə çağırmaq; 2) kömək üçün haraylamaq; 3. qışqırtı ilə/bağırtı ilə demək *(həm də* **to ~ out)**; **to ~ *one's* orders** qışqıraraq əmr vermək, əmrini qışqırtı ilə demək; **to ~ out** ucadan qışqırmaq/bağırmaq; **to ~ out to *smb.*** bir kəsə qışqırmaq

**shouter** ['ʃautəʳ] *n* qışqırıqçı, çığırqan; boşboğaz *(adam)*

**shouting** ['ʃautıŋ] *n* qışqırıq, qışqırtı, çığırtı; bəyənmə/ razılıq ifadə edən qışqırıq/nida; təbrik, salam

**shove**[1] [ʃʌv] *n* **1.** itələmə, güclü təkan/itələmə; **2.** *jarq.* kənar/ azad etmə, çıxartma *(işdən, vəzifədən)*; **to give the ~** azad/kənar etmək, çıxarmaq *(işdən, vəzifədən)*;

◊ **to give *smb.* a ~ off** bir kəsə kömək etmək *(yolun başlanğıcında)*; **to be on the ~** hərəkət etmək, hərəkətdə olmaq

**shove**[2] [ʃʌv] *v* **1.** itələmək; **to ~ *smb.* over a cliff/into the water** bir kəsi qayadan/suya itələmək; **2.** itələşmək; dürtüşmək; *Don't shove İtələşməyin!*; **3.** *d.d.* atmaq, qımçırlamaq; dürtmək; **to ~ a plate on the table** boşqabı stolun üstünə atmaq/qımçırlamaq; **to ~ a book back in the shelves** kitabı şkafa dürtmək; **to ~ along** *d.d.* **1)** qaçmaq, tələsmək, sürətlə getmək, yüyürmək; **2)** itələşmək; keçib getmək; **to ~ aside/away** *d.d.* qoymaq, yığışdırmaq; dürtmək

**shovel**[1] ['ʃʌvl] *n* **1.** çalov; xəkəndaz; bel, kürək; çömçə, abgərdən; **a ~ for coal** kömür çalovu; **a ~ for snow** qar təmizləmək üçün bel/kürək; **2.** *tex.* ekskavator; **3.** *k.t.* gavahın, hop *(kotanın və ya xışın ağzı)*; cığıraçan *(alət)*;

◊ **to put to bed with a ~** dəfn etmək

**shovel**[2] ['ʃʌvl] *v* **1.** kürümək, kürüyüb atmaq/yığmaq; yığmaq, götürmək *(kürəklə, çalovla və s.)*; **to ~up/in coal** kömürü kürümək/kürüyüb yığmaq; **2.** qazmaq, qazımaq; eşələmək; **to ~ the ground/a ditch** torpaq/ kanal qazmaq; **3.** bellə/çalovla işləmək

**shovelful** ['ʃʌvlfl] *adj* çalov dolusu, bir bel/çalov/xəkəndaz/ kürək

**show**[1] [ʃou] *n* **1.** göstərmə, nümayiş etdirmə; **a ~ of force** güc göstərmə/nümayiş etdirmə; **to make a ~ of *smth.*** bir şeydən şou düzəltmək; *Many new computers are on show at the exhibition Bir çox yeni kompyuterlər sərgidə nümayiş etdirilir*; **2.** sərgi; **a flower/cattle/dog/horse ~** çiçək/mal-qara/it/at sərgisi; **3.** tamaşa; **a TV ~** televiziya tamaşası; **a comedy ~ on radio** radioda komediya tamaşası; **4.** *d.d.* təntənə, banket; **to do a ~** təntənədə/ banketdə iştirak etmək; **to do ~s** cəmiyyətdə/camaat arasında olmaq; **5.** görünüş, mənzərə; **a beautiful ~** gözəl mənzərə; **6.** xarici görkəm; **the ~ of things** şeylərin xarici görkəmi;

◊ *Good show! Əla, Çox gözəl!* **to vote by (a) ~ of hands** əl qaldırmaqla səs vermək; **to steal the ~** hamını kölgədə qoymaq, diqqət mərkəzində olmaq

**show**[2] [ʃou] *v (pt* **showed**; *pp* **shown** [ʃoun]) **1.** göstərmək; **to ~ a picture/a dress to *smb.*** bir kəsə şəkil/paltar göstərmək; *They showed me their wedding photos Onlar mənə toy şəkillərini göstərdilər*; *He showed his ticket at the door O, biletini qapıda göstərdi*; *I'll show him how do it/what to do Mən ona onu necə etməyi/nə etməyi göstərəcəm*; *Her new book shows her to be a first-rate novelist Onun yeni kitabı göstərir ki, o, birinci dərəcəli roman yazandır*; **2.** nümayiş etdirmək; **to ~ paintings** rəsmlər nümayiş etdirmək; **to ~ goods** mal/əmtəə nümayiş etdirmək; **3.** oynamaq; *They are showing "Hamlet" tonight Bu axşam onlar "Hamlet"i oynayırlar*; **4.** görünmək; *The building /The tree shows from a distance Bina/Ağac uzaqdan görünür*; **5.** görünmək, cəmiyyətdə olmaq *(adamlar arasında)*; **6.** təqdim etmək; **to ~ a document** sənəd təqdim etmək; **7.** ötürmək; **to ~ *smb.* to a place** bir kəsi bir yerə ötürmək; **to ~ *smb.* to the gate/to the station** bir kəsi qapıya/vağzala qədər ötürmək; **to ~ off** *d.d.* göstərmək; **to ~ off *one's* knowledge** biliyini göstərmək; **to ~ of *one's* wealth** var-dövlətini göstərmək, var-dövləti ilə öyünmək; **to ~ round** müşayiət etmək; **to ~ *smb.* round a town /round an exhibition** bir kəsə şəhəri/sərgini göstərmək; **to ~ up** ifşa etmək; **to ~ up a swindler** fırıldaqçını/dələduzu ifşa etmək;

◊ **to have *smth.* to ~ *one's* labour** boş-boşuna işləməmək, işinin bəhrəsi olmaq; **to have nothing to ~ for it** heç nəyə nail olmamaq, havayı zəhmət çəkmək; **to ~ the whip** qamçı ilə hədələmək; **to ~ the door** qapını göstərmək, qovmaq; **to ~ the white feather** qorxaqlıq etmək, ağciyər olmaq

**show-bill** ['ʃoubıl] *n* afişa

**show-case** ['ʃoukeıs] *n* vitrin *(mağazada, muzeydə və s.)*

**show-down** ['ʃoudaun] *n* **1.** kartı açma/göstərmə *(kart oyununda)*; **2.** *d.d.* öz fikrini/planını bəyan etmə/ açıqlama; açıq bəyanat/etiraf; **a ~ of facts** faktları açıb göstərmə/bəyan etmə; **to force a ~** kartını göstərməyə məcbur etmə, planı/fikri açıb söyləməyə məcbur etmə; **a ~ of strength** güc nümayiş etdirmə; **3.** *d.d.* açıq mübarizə; güclərin mübarizəsi; **a ~ of views/of opinions** baxışların/rəylərin açıq mübarizəsi;

◊ *If it comes to a show-down... Əgər açıq desək, ... Açıq-açığına desək...*

**shower**[1] ['ʃauəʳ] *n* **1.** leysan, güclü/şiddətli yağış; güclü yağmur *(qar, dolu)*; **a ~ of rain** leysan, güclü/şiddətli yağış; **a ~ of hail** güclü/şiddətli dolu; **a ~ of snow** bərk qar düşmə/yağma; **2.** duş; **a room with a ~** duşu olan otaq; *She's in the shower O, duş qəbul edir*; **to have a hot/a cold ~** isti/soyuq duş qəbul etmək; **3.** bol, çox; sel; **~ of tears** bol/çox göz yaşları; **a ~ of arrows/of bullets/of blows** ox/güllə/zərbə seli; *Letters/Gifts come in showers Məktublar/Hədiyyələr sel kimi gəlir*

**shower**[2] ['ʃauəʳ] *v* **1.** duş qəbul etmək; *He showered and went out O, duş qəbul edib getdi*; **2.** örtmək, basmaq; atmaq, tullamaq, yağdırmaq *(həm də* **to ~ up)**; **to ~ stones on/upon *smb.*** bir kəsə daş atmaq, bir kəsi daşa basmaq; **to ~ bullets on/upon *smb.*** bir kəsin üstünə güllə yağdırmaq; bir kəsi gülləyə basmaq; **to ~ gifts on/upon *smb.*** bir kəsin üstünə hədiyyələr yağdırmaq; **3.** güclü/şiddətli yağmaq *(yağış, qar, dolu və s. haq.)*; *It's showering Bərk yağış/leysan yağır*; **4.** sulamaq; səpmək *(su)*

**showerproof** ['ʃauəpru:f] *adj* yağışkeçirməyən, yağışkeçirməz; **a ~ jacket** yağışkeçirməyən/yağışkeçirməz pencək

**showery** ['ʃauərı] *adj* yağışlı, yağmurlu; **a ~ day** yağmurlu/yağışlı gün; **~ weather** yağmurlu hava

**showman** ['ʃoumən] *n (pl* **-men** [-mən]) **1.** şoumən *(kütləvi tamaşalar təşkil edən adam)*; **2.** sirk sahibi/ direktoru; heyvanxana sahibi/direktoru

**showmanship** ['ʃoumənʃıp] *n* **1.** şoumenlik qabiliyyəti; kütləvi tamaşalar təşkil etmək məharəti; **2.** diqqəti cəlb edə bilmə qabiliyyəti/məharəti

**shown** [ʃoun] **to show** *felinin pp forması*

**showroom** ['ʃouru:m] *n* sərgi/nümayiş zalı

**show-up** ['ʃou'ʌp] *n* üstünü açma, üstü açılma, aşkara çıxma/çıxartma; ifşa etmə/edilmə; meydana çıxarma *(çatışmazlığı və s.)*

**showy** ['ʃouı] *adj* **1.** təsir bağışlayan; nəzəri cəlb edən, parlaq, kəskin *(rəng haq.)*; **a ~ dress** nəzəri cəlb edən paltar; **~ flowers** parlaq çiçəklər; **~ colours** kəskin/ parlaq rənglər; **2.** müstəsna, son dərəcə gözəl, qeyri-adi; **~ talents** müstəsna/qeyri-adi istedadlar; **3.** nümunəvi; zahiri, süni; lovğa, özünü öyən

**shred**[1] [ʃred] *n* **1.** kəsik, tikə, qırıq, parça; **to tear a cloth in/into ~s** parçanı tikə-tikə/parça-parça etmək; **2.** zərrəcik, zərrə, bir zərrə, bir az, cüzi miqdar; **a ~ of evidence** bir zərrə sübut; **a ~ of truth** bir zərrə həqiqət

**shred**[2] [ʃred] *v* **(-dd-)** kəsmək, xırda-xırda kəsmək/ doğramaq; **to ~ cabbage** kələmi xırda-xırda doğramaq

**shredder** ['ʃredəʳ] *n* sürtkəc, pendirtəraş, turptəraş; **a vegetable ~** tərəvəz sürtkəci

**shrew** [ʃru:] *n* **1.** *arx.* deyingən qadın/arvad; **2.** *zool.* yerəşən, gorəşən

**shrewd** [ʃru:d] *adj* **(-er, -est) 1.** ağıllı, fərasətli, bəsarətli, gözüaçıq; düşüncəli, ağlı başında; həssas; bacarıqlı, təcrübəli; **a ~ businessman** bacarıqlı/fərasətli/təcrübəli biznesmən; **a ~ observer** həssas müşahidəçi; **2.** bərk, kəskin, ağır; **a ~ blow** bərk/kəskin zərbə; **~ wind** kəskin/bərk külək; **3.** mahir, məharətli, qabil, bacarıqlı; dəqiq; **a ~ reply** dəqiq cavab; **4.** *arx.* acı, kobud; qəzəbli, kinli; **~ tongues** acı dillər



**shrewdly** ['ʃru:dlı] *adv* **1.** fərasətlə, bəsarətlə, ağılla; **2.** kəskin, qüvvəli, qəti olaraq; **to mistrust ~** qəti olaraq inanmamaq/etibar etməmək; *The girl eyed him shrewdly Qız ona kəskin baxdı*

**shrewdness** ['ʃru:dnıs] *n* fərasət, bəsirət, ağıllılıq, fərasətlilik, gözüaçıqlıq; **rare ~** nadir fərasət/ağıllılıq; **natural ~** fitri/anadangəlmə fərasət

**shrewish** ['ʃru:ıʃ] *adj* **1.** deyingən, davakar, cəncəl, öcəşkən; daim donquldanan/mırıldayan; **2.** hirsli, acıqlı, qəzəbli, kinli

**shrewishness** ['ʃru:ıʃnıs] *n* deyingənlik, davakarlıq, öcəşkənlik

**shriek**[1] [ʃri:k] *n* qulaqbatıran səs/haray/fəryad/ nalə/ şivən/ fəğan/inilti; *The child let out/gave an ear-piercing shriek Uşaq qulaqbatırıcı şivən/fəryad qaldırdı*

**shriek**[2] [ʃri:k] *v* **1.** bərkdən qışqırmaq/bağırmaq, fəryad/ fəğan etmək; **to ~ with fright** qorxudan bərk qışqırmaq/ bağırmaq; **to ~ with pain** ağrıdan bərk qışqırmaq/ bağırmaq; **2.** çağırmaq, haraylamaq; **to ~ for help** köməyə çağırmaq /haraylamaq

**shrill**[1] [ʃrıl] *n* qulaqbatırıcı qışqırıq/bağırtı/fəryad

**shrill**[2] [ʃrıl] *adj* **1.** qulaqbatırıcı, hündür, uca *(səs haq.)*; kəskin; **~ whistle** kəskin/qulaqbatırıcı fit/fıştırıq/ vıyıltı/ vızıltı; **2.** səsli-küylü; **~ gaiety** səsli-küylü əyləncə; **3.** zəhlətökən, təngəgətirən, usandırıcı, usandıran; canagətirən; **~ criticisms** usandırıcı/zəhlətökən tənqidlər

**shrilly** ['ʃrılı] *adv* bərkdən, ucadan, şiddətlə; **to scream ~** bərkdən/ucadan qışqırmaq; **to laugh ~** bərkdən/ucadan gülmək

**shrimp**[1] [ʃrımp] *n* **1.** *zool.* krevet *(xırda dəniz xərçəngi)*; **2.** karlik *(çox kiçik boylu adam)*

**shrimp**[2] [ʃrımp] *v* krevet *(xırda dəniz xərçəngi)* tutmaq

**shrine** [ʃraın] *n* **1.** məqbərə, sərdabə, türbə, qəbr; **2.** mehrab, səcdəgah; məbəd; **~ of beauty/of art** gözəllik/ incəsənət məbədi; **3.** *məc.* müqəddəs yer, ziyarətgah; **national ~** milli ziyarətgah; **4.** monastır; **secret ~** gizli monastır

**shrink**[1] [ʃrıŋk] *n* yığılma *(quruma, soyuma, yuyulma nəticəsində)*

**shrink**[2] [ʃrıŋk] *v (pt* **shrank** [ʃræŋk] *və ya* **shrunk** [ʃrʌŋk]; *pp* **shrunk** [ʃrʌŋk]) **1.** yığılmaq, gödəlmək, girmək *(parça və s.)*; **to ~ after laundering** yuyulduqdan sonra yığılmaq/girmək; *Wool shrinks in the wash Yuyulduqda yun parça yığılır*; **metals that ~ when cooling** soyuduldūqda yığılan metallar; **2.** büzüşmək; **to ~ with cold** soyuqdan büzüşmək; **to ~ into oneself** yumaq kimi büzüşmək; **3.** qurumaq; *Streams shrink from drought Çaylar quraqlıqdan quruyur*; **4.** aralaşmaq, gözdən itmək, yox olmaq; **to ~ from the room** otaqdan yox olmaq; **to ~ out of sight** gözdən itmək; **to ~ away** yığılmaq, büzüşmək; balacalaşmaq; **to ~ away with horror** dəhşətdən büzüşmək; **5.**

azalmaq; *My income has shrunk Mənim gəlirim azalıb,*
◊ **to ~ into oneself** özünə qapanıb qalmaq, cəmiyyətdən uzaqlaşmaq
**shrinkage** [ˈʃrıŋkıdʒ] *n* 1. kiçilmə, sıxılma, sıxlaşma *(quruma, soyuma, donma və s. nəticəsində)*; **~ of clothes in the wash** yuyularkən paltarın kiçilməsi; 2. azalma; **a ~ of trade** ticarətin azalması; 3. quruma
**shrinkproof** [ˈʃrıŋkpru:f] *adj toxuc.* kiçilməyən, qısalmayan, girməyən *(parça və s. haq.)*
**shrivel** [ˈʃrıvl] *v* (-ll-) 1. *(həm də* **to ~ up/away**) qırışmaq, büzüşmək; qurumaq, solmaq *(istidən, soyuqdan; həm də məc.)*; *The leaves had shrivelled (up) in the sun Yarpaqlar günəşdə solmuşdu/qurumuşdu*; 2. qurutmaq, soldurmaq; qırışdırmaq
**shrivelled** [ˈʃrıvıld] *adj* büzüşmüş, qırışmış; **an old man with a ~ face** üzü/sifəti qırışmış qoca kişi
**shroud[1]** [ʃraud] *n* 1. *(həm də* **winding-sheet**) kəfən; 2. *məc.* örtük; pərdə; **a ~ of mist** duman örtüyü/pərdəsi: **in a ~ of darkness** gecənin qaranlığında
**shroud[2]** [ʃraud] *v* 1. kəfənə bükmək/tutmaq; 2. gizlətmək, bürümək, örtmək; **to ~ in the darkness** qaranlıqda gizlətmək
**shrub** [ʃrʌb] *n* kol; **evergreen ~s** həmişəyaşıl kollar; **to plant ~s in autumn** payızda kollar əkmək
**shrubbery** [ˈʃrʌbrı] *n* kolluq; **dense ~** qalın/sıx kolluq
**shrug[1]** [ʃrʌg] *n* çəkmə *(çiyini)*; **to give a resigned ~ of the shoulders** çiyinlərini çəkməklə razılıq bildirmək; **to answer with a ~ of the shoulders** çiyinlərini çəkməklə cavab vermək
**shrug[2]** [ʃrʌg] *v* (-gg-) çiyinlərini çəkmək; *I asked her where Sam was, but she simply shrugged her shoulders and said nothing Mən ondan Səmin harada olduğunu soruşdum, o sadəcə olaraq çiyinlərini çəkdi və heç nə demədi*
**shrunk** [ʃrʌŋk] **to shrunk** *felinin pt və pp formaları*
**shrunken[1]** [ˈʃrʌŋkən] *adj* büzüşmüş, bürüşmüş; qırışmış; **~ apples** bürüşmüş/büzüşmüş almalar; **~ cheeks** qırışmış yanaqlar
**shrunken[2]** [ˈʃrʌŋkən] **to shrink** *felinin pp forması*
**shuck[1]** [ʃʌk] *n* 1. qabıq *(qozun və s.)*; 2. *bot.* qın; **~ of corn** qarğıdalı qıçının qını; 3. qabıq *(meyvədə)*, toxum qabığı
**shuck[2]** [ʃʌk] *v* 1. qabığını almaq/soymaq; **to ~ peas/corn** noxudun/qarğıdalının qabığını almaq; 2. *d.d.* çıxardıb atmaq/tullamaq; **to ~ *one's* clothes** paltarını çıxardıb atmaq; *He shucked his clothes O, paltarını çıxardıb atdı*
**shudder[1]** [ˈʃʌdəʳ] *n* titrəmə, əsmə; lərzə;
◊ **to give *smb.* the ~s** bir kəsi qorxuya /lərzəyə salmaq
**shudder[2]** [ˈʃʌdəʳ] *v* titrəmək, əsmək, lərzəyə gəlmək; **to ~ with fear** qorxudan titrəmək/əsmək; **to ~ to think of *smth.*** bir şey haqqında fikirləşmədən lərzəyə gəlmək; *Thinking about the accident makes me shudder Qəza haqqında fikirləşmək məni lərzəyə gətirir; The whole house shuddered as the bomb exploded Bomba partlayanda bütün ev tərpəndi/titrədi*
**shuffle[1]** [ˈʃʌfl] *n* 1. ayaqlarını sürtə-sürtə yerimə; sürümə *(ayaqlarını)*; xışıltı; **to hear a ~ of feet** ayaq xışıltısı eşitmək; 2. qarışdırma *(oyun kartını)*; **to give cards a good ~** kartı yaxşı-yaxşı qarışdırmaq
**shuffle[2]** [ˈʃʌfl] *v* 1. ayaqları sürtə-sürtə/sürüyə-sürüyə yerimək; *Walk properly, don't shuffle Əməlli-başlı yeri/yeriyin, ayaqlarını/ayaqlarınızı sürümə/sürüməyin*; 2. kartı qarışdırmaq; *Who is going to shuffle Kim qarışdıracaq (kartı)? She shuffled the cards (up) O, kartları qarışdırdı*; 3. qatmaq, qarışdırmaq; qoymaq *(həm də* **to ~ off**); **to ~ off the blame on to *smb.*** günahı/suçu başqasının üstünə qoymaq; **to ~ off responsibility on to *smb.*** məsuliyyəti başqasının üstünə qoymaq; 4. **(through)** tez-tələsik/necə gəldi etmək; **to ~ through *one's* work** işini tez-tələsik/necə gəldi yerinə yetirmək; 5. qurdalanmaq, qımıldanmaq, aramsız olaraq tərpənmək, yerində rahat oturmamaq; 6. ayaqlarını və ya vəziyyətini dəyişmək; *He began to shuffle awkwardly one foot to the other O, ağır-ağır bir ayağını götürüb o birini qoymağa başladı*; 7. aldatmaq, biclik etmək; *Don't shuffle Biclik etmə/etməyin*; **to ~ off** soyunmaq, çıxartmaq *(paltarı)*; **to ~ out (of) 1)** qurtarmaq, xilas olmaq; **to ~ out of an awkward situation** çətin/müşkül vəziyyətdən qurtarmaq/çıxmaq; **2)** çıxartmaq, atmaq; *He shuffled the whole matter out of his mind O, bütün bu məsələni başından çıxartdı/atdı*
**shuffler** [ˈʃʌfləʳ] *n* 1. paylayan *(kart oyununda)*; 2. zirək/cəld/diribaş/bacarıqlı adam
**shun** [ʃʌn] *v* çəkinmək, qaçınmaq, uzaqlaşmaq, kənar gəzmək; **to ~ danger** təhlükədən qaçmaq/kənar gəzmək; **to ~ temptation** tamahdan çəkinmək/qaçınmaq
**shunt** [ʃʌnt] *v* 1. *(adət. məchulda)* çəkmək, yerini dəyişdirmək, yerindən tərpətmək; çəkinmək, uzaqlaşmaq; 2. *d.d.* itələmək *(geri)*, uzaqlaşdırmaq; təxirə salmaq; 3. *d.y.* başqa yola çəkmək *(vaqonu)*; 4. *el.* paralel qoşmaq
**shunter** [ˈʃʌntəʳ] *n* 1. *d.y.* strelkaçı, yolayıran; qatarları tərtib edən; 2. *d.d.* işbaz, zirək/diribaş /bacarıqlı adam
**shush[1]** [ʃʌʃ] *v d.d.* susdurmaq, sakitləşdirmək, susmağa məcbur etmək; *He began to speak but was hastily shushed O danışmağa başladı, lakin tezliklə susduruldu*
**shush[2]** [ʃʌʃ] *int.* Ş-ş! Sakit!
**shut** [ʃʌt] *v* (-tt-; *pt, pp* **shut**) 1. örtmək; **to ~ the door/the window** qapını/pəncərəni örtmək; *Please shut the door Zəhmət olmasa, qapını ört/örtün*; **to ~ a book** kitabı örtmək; *Please shut the book and listen to me Zəhmət olmasa, kitabı ört/örtün və mənə qulaq as/asın*; 2. bağlamaq/ örtmək; **to ~ the window** pəncərəni bağlamaq/örtmək; *The gate wasn't shut Darvaza bağlanmamışdı; The window won't shut Pəncərə bağlanmır; The doors of the shop shut automatically Mağazanın qapıları avtomatik olaraq bağlanır; What time do the shops shut? Mağazalar nə vaxt bağlanır?* 3. yummaq; **to ~ *one's* eyes/mouth** gözünü/ağzını yummaq; *Her mouth opened and shut, but no sound came out Onun ağzı açıldı və yumuldu, lakin heç bir səs çıxmadı*; 4. bükmək; **to ~ an umbrella/a knife** çətiri/bıçağı bükmək; **to ~ down 1)** bağlamaq *(müəssisəni)*; **2)** işi qurtarmaq; **to ~ off 1)** açmaq, qoşmaq *(suyu, cərəyanı)*; **2)** kəsmək, bağlamaq *(yolu və s.)*; **to ~ out 1)** icazə verməmək, qoymamaq; **to ~ out immigrants** mühacirlərin getməsinə icazə verməmək; **2)** qabağını/qarşısını kəsmək; **to ~ out light** işığın qarşısını kəsmək;
◊ **to be/to get ~ of *smth.*, to ~ *one's* hands of *smth.*** bir şeydən azad olmaq/yaxa qurtarmaq; **to ~ *one's* lights off** intihar etmək, özünü öldürmək; **to have ~ up shop-windows** müflisləşmək, müflis olmaq, var-yoxdan çıxmaq
**shut-down** [ˈʃʌtdaun] *n* 1. bağlanma *(müəssisə haq.)*; *Since the shut-down, hundreds of miners have been out of work Şaxtanın bağlanılmasından bəri minlərlə fəhlə işsizdir/işsiz qalıb*; 2. *tex.* saz olmama; dayanma
**shutter[1]** [ˈʃʌtəʳ] *n* 1. pəncərə qapağı/taxtası; 2. *tex.* sürgü, cəftə, rəzə; 3. *fot.* obyektivin sürgüsü *(fotoaparatda)*;
◊ **to put up the ~s** müəssisəni/mağazanı bağlamaq *(gecə)*
**shutter[2]** [ˈʃʌtəʳ] *v* pəncərənin qapağını/taxtasını bağlamaq
**shuttered** [ˈʃʌtəd] *adj* bağlı; **~ windows** bağlı pəncərələr; *The house was empty and shuttered Ev boş və bağlı idi*
**shuttle[1]** [ˈʃʌtl] *n* 1. məkik *(tikiş maşınında, toxucu dəzgahında)*; 2. ikibaşlı hərəkət, iki məntəqə arasında mütəmadi hava xətti
**shuttle[2]** [ˈʃʌtl] *v* irəli-geri hərəkət etmək/etdirmək
**shuttlecock[1]** [ˈʃʌtlkɔk] *n* 1. volan *(badminton oynamaq üçün ləlәkli top)*; 2. nəhayətsiz mübahisə və ya narazılıq mövzusu/obyekti; 3. səbatsız/tərəddüd edən/qərarsız adam
**shuttlecock[2]** [ˈʃʌtlkɔk] *v* 1. irəli-geri atmaq; 2. irəli-geri hərəkət etmək
**shuttle-train** [ˈʃʌtltreın] *n d.y.* yaxın məsafəyə işləyən qatar
**shy[1]** [ʃaı] *n* 1. sıçrayış *(hürkmüş at və s. haq.)*; 2. atma, tullama; **to have a ~** atmaq, tullamaq; 3. *d.d.* kəskin hücum; **to have/to take a ~ at *smb.*** bir kəsə (qarşı) kəskin hücum etmək; 4. *d.d.* cəhd, səy; **to have a ~ at doing *smth.*** bir şey etməyə cəhd etmək/səy göstərmək
**shy[2]** [ʃaı] *adj* **(shyer, shyest)** 1. utancaq, həyalı; dinc; **a ~ girl** utancaq/həyalı qız; **a ~ smile** həyalı təbəssüm; *He's very shy with strangers O, yad/tanımadığı adamlardan çox utanır*; 2. qorxaq, ehtiyatlı *(heyvanlar, quşlar haq.)*; *Hares are very shy Dovşanlar çox qorxaqdırlar*; 3. hürkək *(at haq.)*; 4. **(of)** qərarsız, qətiyyətsiz, mütərəddid; cəsarətsiz, aciz; *He's shy of taking the responsibility O üzərinə məsuliyyət götürməkdə qətiyyətsizdir; He's shy of interfering O, işə qarışmağa cəsarət etmir*; 5. **(of)** qorxaq, inamsız; **to be ~ of death** ölümdən qorxmaq; **to be ~ of people** insanlardan qaçmaq; 6. uzaq, sakit; xəlvət, gizli; tənha; **~ recesses** xəlvət/gizli künclər; **a ~ house** tənha ev;
◊ **to look ~ on/at people** insanlara şübhə ilə /inamsızlıqla baxmaq
**shy[3]** [ʃaı] *v* I *(pt, pp* **shied** [ʃaıd]) 1. geri çəkilmək, qətiyyətsizlik/səbatsızlıq göstərmək, tərəddüd etmək; vaz keçmək; *They shied away from buying the house when they learnt the full price Tam qiyməti öyrəndikdə, onlar evi almaqdan vaz keçdilər/geri çəkildilər*; 2. hürkmək *(at haq.)*; *The horse shied at loud noise and threw its rider At uca səsdən hürkdü və atlını yıxdı*; 3. qorxmaq; **to ~ at the sight of blood** qan görəndə qorxmaq
**shy** [ʃaı] *v* II *(pt, pp* **shied** [ʃaıd]) 1. atmaq; **to ~ at a cow/at a cock with a stone** inəyə/xoruza daş atmaq; **to ~ a ball to the other end of the field** topu meydanın o biri tərəfinə atmaq; 2. atılmaq, şığımaq, hücum etmək
**sibilant[1]** [ˈsıbılənt] *n fon.* fışıltılı samit
**sibilant[2]** [ˈsıbılənt] *adj* fışıltılı; **~ sounds** fışıltılı səslər
**sibilation** [.sıbıˈleıʃn] *n* fışıltı, xışıltı; **the ~s of the dry grass** quru otun xışıltısı
**sibling** [ˈsıblıŋ] *n* doğma qardaş/bacı; doğma uşaqlar
**sick[1]** [sık] *n* 1. qusuntu; 2. xəstə; **the ~** xəstələr; *All the sick and wounded were evacuated Bütün xəstələr və yaralılar köçürüldü*
**sick[2]** [sık] *adj* **(-er, -est)** 1. xəstə, naxoş, azarlı; **a ~ child** xəstə/naxoş/azarlı uşaq; *She has been sick for a week O, bir həftədir ki, xəstədir/naxoşdur/azarlıdır*; **a ~ animal/ plant** xəstə heyvan/bitki; **to feel ~** özünü xəstə/naxoş hiss etmək; *You'll make yourself sick if you eat all those sweets O konfetlərin hamısını yesən/yesəniz xəstələnəcəksən/xəstələnəcəksiniz*; 2. ürəyi bulanan, ürək bulantısı hiss edən; *He's sick Onun ürəyi bulanır; She feels sick Onun qusmağı gəlir*; 3. qüssələnən, kədərlənən, xiffət çəkən, darıxan; **to be ~ for a sight of home**

evi görmək üçün darıxmaq/xiffət çəkmək; *She's sick at heart O, ürəyində qüssələnir/xiffət çəkir*; **4**. ovqatı təlx olmuş, dilxor olmuş; dilxor, pərt, məyus; *He was sick at missing the train O, qatara gecikdiyi üçün pərt/ dilxor idi*; **5**. durğun; **a ~ economy** durğun iqtisadiyyat; **6**. tutqun, solğun; **~ light** solğun/tutqun işıq; **7**. *k.t.* yorğun; **~ soil** yorğun torpaq; **8**. nifrət oyadan, pis; **~ humour** nifrət oyadan yumor;

◊ **to be ~ as a dog/as a horse** özünü çox pis hiss etmək; *I'm sick and tired of it Mən bundan lap cana gəlmişəm/bezmişəm*

**sickbay** [ˈsɪkbeɪ] *n* gəmi xəstəxanası/lazareti

**sickbed** [ˈsɪkbed] *n* xəstə yatağı

**sicken** [ˈsɪkn] *v* **1**. xəstələnmək; *He sickened and died O xəstələndi və öldü*; **2**. qusmaq, qusmaq hiss etmək, ürəyi bulanmaq; *He sickens at the smell Bu iydən onun qusmağı gəlir/ürəyi bulanır*; **3**. nifrət bəsləmək; özünü pis hiss etmək; *He sickens at the sight of blood O, qan görəndə özünü pis hiss edir*; **4**. əsəbiləşdirmək, cana gətirmək; *He sickened of his new neighbour O, təzə qonşusundan cana gəldi*; **5**. darıxmaq, ürəyi sızlamaq, usanmaq; **6**. zəifləmək, sarsımaq; *His resolution sickened Onun qətiyyəti sarsıdı*

**sickening** [ˈsɪkənɪŋ] *adj* xoşagəlməz, ürəkbulandırıcı, iyrənc, çirkin, çox pis, mənfur; **a ~ smell** ürəkbulandırıcı /iyrənc iy; **a ~ sight** xoşagəlməz/çox pis mənzərə; **~ cruelty** mənfur qəddarlıq; *It's sickening to see such cruelty Belə qəddarlıq görmək ürək bulandırır*

**sickeningly** [ˈsɪkənɪŋlɪ] *adv* xoşagəlməz/ürəkbulandırıcı bir tərzdə, çox pis

**sicker** [ˈsɪkəʳ] *adj* **1**. etibarlı, mötəbər, təhlükəsiz; **a ~ man** mötəbər/etibarlı adam; **2**. möhkəm, bərk; həmişəlik; **3**. şübhəsiz, doğru, gerçək, həqiqi; **to make ~** inanmaq, əmin olmaq, yəqin etmək

**sick-headache** [ˈsɪk.hedeɪk] *n tib.* miqren, ürəkbulanması ilə müşayiət olunan baş ağrısı

**sickish** [ˈsɪkɪʃ] *adj* **1**. zəif, xəstə, nasaz; **to feel ~** özünü zəif/xəstə/nasaz hiss etmək; **2**. ürəkbulandıran, ürəkbulandırıcı, iyrənc; **~ smell** ürəkbulandıran/iyrənc iy; **~ taste** iyrənc/ürəkbulandırıcı dad

**sickle** [ˈsɪkl] *n* oraq; **~ and hammer** oraq və çəkic

**sickly** [ˈsɪklɪ] *adj* **1**. xəstə, naxoş, azarlı; **a ~ child** xəstə uşaq; *He looked sickly and weak O, xəstə və zəif görünürdü*; **2**. ürəkbulandırıcı, ürəkbulandıran, iyrənc; **a ~ smell** ürəkbulandırıcı/iyrənc iy; **a ~ taste** iyrənc/ ürəkbulandıran dad; **3**. zərərli, ziyanlı; **~ climate** zərərli/ziyanlı iqlim

**sickness** [ˈsɪknɪs] *n* **1**. xəstəlik, naxoşluq, nasazlıq; *There's a lot sickness in the village Kənddə çoxlu xəstəlik var; They were absent because of sickness Onlar xəstəliyə/ naxoşluğa görə iştirak etmirdilər*; **2**. ürəkbulanması, öyümə; *The sickness passed after I lay down Mən uzandıqdan sonra ürəkbulanması/öyümə keçdi*

**sick-nurse** [ˈsɪknəːs] *n* tibb bacısı

**sick-room** [ˈsɪkrʊm] *n* xəstələr üçün otaq

**side**[1] [saɪd] *n* **1**. tərəf; **left/right/sunny/shady ~ of the street** küçənin sol/sağ/günəşli/kölgəli tərəfi; **to study a question/a problem from all ~s** məsələni/problemi hərtərəfli öyrənmək; **to walk along the shady ~ of the street** küçənin kölgəli tərəfi ilə getmək; **to go over to the other ~ of the room** otağın o biri tərəfinə getmək; *He crossed the bridge to the other side of the river O, körpüdən çayın o biri tərəfinə keçdi*; **the four ~ of a square/paralelogram** kvadratın/paraleloqramın dörd tərəfi; **to write on both ~s of a sheet of paper** vərəqin hər iki tərəfində yazmaq; **2**. divar; hasar, sədd; **the ~s of a box** qutunun divarları; **the ~s of a house** evin divarları; **3**. hissə, bölgə, rayon; **the east/the north ~ of the city** şəhərin şərq/şimal bölgəsi; **4**. yan, yan tərəf; **to sit at the ~s** yanbayan/yanyana oturmaq; **to sit on the ~ of the bed** çarpayının yan tərəfində oturmaq; **5**. böyür, bel; **to shake/to split *one's* ~s with laughing** gülməkdən böyrünü yırtmaq; **to put *one's* hands to his ~s** əllərini belinə qoymaq; *He put his hands to his sides O, əllərini belinə qoydu*;

◊ **to be on the right/on the sunny ~ of forty** yaşının 40-45 sinnində olmaq; **to be on the wrong/on the shady ~ of forty** yaşın 45-49 sinnində olmaq; **to be born on the wrong ~ of the blanket** kəbinsiz doğulmaq, bic olmaq; **to put a question on one ~** məsələyə fikir verməmək/ diqqət yetirməmək, məsələyə birtərəfli yanaşmaq

**side**[2] [saɪd] *v* tərəfini saxlamaq, bir olmaq; *He sided with his natives O, yerlilərinin tərəfini saxladı, O, yerliləri ilə bir oldu*

**sideboard** [ˈsaɪdbɔːd] *n* servant, bufet

**side-box** [ˈsaɪdbɔks] *n* yan loja *(teatrda)*

**side-dish** [ˈsaɪddɪʃ] *n* qarnir *(ət və ya balıq xörəklərinə əlavə olunan səbzəvat və s.)*; xuruş

**side-door** [ˈsaɪddɔːʳ] *n* yan qapı

**side-glance** [ˈsaɪdglaːns] *n* çəpəki baxış

**side-lamp** [ˈsaɪdlæmp] *n* yan fənər, fənərcik *(avtomobilin qabaq qanadı üstündə)*

**sidelight** [ˈsaɪdlaɪt] *n* **1**. yan işıq/işıqlandırma; **2**. *məc.* təsadüfi məlumat; **3**. yan pəncərə

**sideline**[1] [ˈsaɪdlaɪn] *n* **1**. yan xətt *(həm də id.)*; *The coach stood on the sideline shouting to his players Məşqçi yan xətdə durub öz oyunçularına qışqırırdı*; **2**. əlavə məşğuliyyət/iş; **3**. *k.t.* çidarlamaq üçün kəndir *(atı və s.)*

**sideline**[2] [ˈsaɪdlaɪn] *v* **1**. kənarlaşdırmaq, çıxartmaq *(oyunçunu oyundan)*; *Our best player has been sidelined by a knee injury Diz zədəsinə görə bizim ən yaxşı oyunçumuz oyundan çıxarıldı/kənarlaşdırıldı*; **2**. qabaq və ya dal ayaqlarını çidarlamaq/bağlamaq *(atın və s.)*



**sidelong**[1] [ˈsaɪdlɔŋ] *adj* **1**. çəpəki, yanpörtü; **~ glance** çəpəki baxış/nəzər; **to sit ~** yanpörtü oturmaq; **2**. qeyri-müəyyən, qeyri-səmimi; ikimənalı; **a ~ answer** qeyri-müəyyən/ikimənalı cavab

**sidelong**[2] [ˈsaɪdlɔŋ] *adv* **1**. çəpəki; **to look ~ at *smb.*** bir kəsə çəpəki baxmaq; **2**. yanakı; *She squeezed sidelong through the passage O, keçiddən yanakı girdi/soxuldu*; **3**. yanı/böyrü üstə; **to lie ~** yanı/böyrü üstə uzanmaq

**sidelook** [ˈsaɪdluk] *n* = **sideglance**

**sidepocket** [ˈsaɪd.pɔkɪt] *n* yan cib

**sidesaddle** [ˈsaɪd.sædl] *n* qadın üçün yəhər *(yanpörtü oturmaq üçün)*

**sideshow** [ˈsaɪdʃou] *n* intermediya *(tamaşanın iki pərdəsi arasında oynanılan kiçik komik əsər)*; əlavə edilmiş kiçik əsər/nömrə

**sidestep**[1] [ˈsaɪdstep] *n* kənara atılan addım

**sidestep**[2] [ˈsaɪdstep] *v* **(-pp-)** **1**. kənara durmaq /çəkilmək; **2**. zərbədən qaçmaq; **3**. *məc.* boyun /baş qaçırmaq; **to ~ a question** suala cavab verməkdən boyun qaçırmaq; **to ~ responsibility** məsuliyyətdən boyun qaçırmaq; **to ~ facts** faktların üstündən keçmək; **4**. *amer.* təxirə salmaq, ləngitmək *(qərarı)*

**sidetrack**[1] [ˈsaɪdtræk] *n* **1**. *d.y.* ehtiyat yol; **2**. *məc.* ikinci dərəcəli rol

**sidetrack**[2] [ˈsaɪdtræk] *v* **1**. *d.y.* ehtiyat yola keçirmək/ qoymaq; **2**. *məc.* yayınmaq; **to ~ an issue** məsələdən yayınmaq

**sideview** [ˈsaɪdvjuː] *n* yandan/böyürdən görünüş

**sidewalk** [ˈsaɪdwɔːk] *n* səki, küçə səkisi

**sidewall** [ˈsaɪdwɔːl] *n* yan divar

**sideward** [ˈsaɪdwəd] *adv* kənara, yana, yan tərəfə

**sidewards** [ˈsaɪdwədz] *adv* = **sideward**

**sideway**[1] [ˈsaɪdweɪ] *n* **1**. yan/kənar yol, dolama yol/cığır; **2**. *amer.* səki, piyadalar üçün yol

**sideway**[2] [ˈsaɪdweɪ] *adj* çəpəki, yana istiqamətlənmiş; **~ gaze on the stranger** yad adama çəpəki baxış

**sideways**[1] [ˈsaɪdweɪz] *n* **1**. çəpəki; **2**. vasitəli

**sideways**[2] [ˈsaɪdweɪz] *adv* **1**. yandan, böyürdən, yan/böyür tərəfdən; **2**. kənara, çəpəki; *He looked sideways at me O mənə çəpəki baxdı*; **3**. yanakı, yandan, qıraqdan, kənardan; *A crab moves sideways Krab yanakı hərəkət edir*

**side-wind** [ˈsaɪdwɪnd] *n* **1**. yandan əsən külək; **2**. *məc.* dolayı yol; **by a ~** dolayı yolla

**siding** [ˈsaɪdɪŋ] *n* **1**. tərəflərdən birinə birləşmə, tərəflərdən birini müdafiə etmə; **2**. *tik.* üzçəkmə *(divara və s.)*; **3**. kanalın gəmiçiliyə yararlı hissəsi; **4**. *d.y.* ehtiyat yol

**sidle** [ˈsaɪdl] *v* **1**. yanakı yerimək/hərəkət etmək; **2**. yanakı /çəpinə qoymaq; **3**. xəlvəti/oğrun /gizlicə çıxıb getmək; *He sidled to the door and slipped out O, qapıdan gizlicə/xəlvəti keçdi və sivişib evdən çıxdı*

**siege**[1] [siːdʒ] *n* **1**. mühasirə; **state of ~** mühasirə vəziyyəti; **to be in a state of ~** mühasirə vəziyyətində olmaq; **to lay ~ to a town** şəhəri mühasirəyə almaq; **to push a ~** mühasirəni davam etdirmək; **to raise /to lift a ~** mühasirəni aradan qaldırmaq/ləğv etmək; **to stand a ~** mühasirəyə dözmək/tab gətirmək; **2**. *d.d.* uzunmüddətli ağır dövr; **a ~ of illness** xəstəliyin uzunmüddətli ağır dövrü

**siege**[2] [siːdʒ] *v arx.* mühasirəyə almaq *(qalanı)*

**sienna** [ˈsɪenə] *n* siyena *(tünd-sarı boyaq)*

**sieve**[1] [sɪv] *n* **1**. xəlbir, şadara, ələk; **2**. *məc.* boşboğaz, söz saxlamayan, çoxdanışan;

◊ **to have a head/a memory like a ~** heç nə /şey xatırlamamaq; **to put water into a ~** ≅ xəlbirlə su daşımaq *(yəni mənasız işlə məşğul olmaq)*

**sieve**[2] [sɪv] *v* ələmək, ələkdən/xəlbirdən keçirmək; **to ~ flour** un ələmək

**sift** [sɪft] *v* **1**. ələmək, xəlbirləmək, şadaralamaq; ələkdən/xəlbirdən/şadaradan keçirmək; **2**. *məc.* diqqətlə/əsaslı surətdə/incədən-incəyə tədqiq etmək; **to ~ facts** dəlilləri/faktları əsaslı surətdə tədqiq etmək

**sigh**[1] [saɪ] *n* nəfəs, nəfəs alma; **to heave a ~ of relief** rahat nəfəs almaq

**sigh**[2] [saɪ] *v* nəfəs/iç çəkmək; **to ~ with fatigue /with grief/with pain** yorğunluqdan/ qüssədən /ağrıdan iç çəkmək

**sight**[1] [saɪt] *n* **1**. görmə, görmə qabiliyyəti; **good /bad ~** yaxşı/pis görmə; **long ~** 1) uzaqdan /uzağı görmə; 2) *məc.* uzaqgörənlik, tədbirlilik, uzaqgörücülük; **short/near ~** 1) yaxından görmə, uzağı görməmə, göz zəifliyi; 2) *məc.* fərasətsizlik, gələcəyi görə bilməmə; bəsarətsizlik; **2**. görünüş; mənzərə; görkəm; **to know *smb.* by ~** bir kəsi görkəmindən tanımaq; **3**. göz; **to lose ~ of** 1) gözdən itirmək; 2) unutmaq, nəzərdən qaçırmaq; **to catch/to get (a) ~ of** görmək, diqqət yetirmək; **4**. baxış, nöqteyinəzər, rəy; *Do what is right in your own sight Necə istəyirsən/istəyirsiniz, elə də et/edin*; **5**. ani baxış; **to catch/to get (a) ~ of** nəzər salmaq, göz yetirmək, baxmaq; **6**. gözəl mənzərə; *This lake is one of the sights of the world Bu göl dünyanın gözəl mənzərələrindən biridir*; **7**. *pl* diqqətəlayiq/görməli yerlər; **to see the ~s** diqqətəlayiq/görməli yerləri görmək; **8**. *d.d.* çox, çoxlu, yığın; **a ~ of money** bir yığın pul; **9**. *hərb.* nişan, nişangah, arpacıq *(silahda)*;

◊ **at first ~** ilk baxışda

**sight**[2] [saɪt] *v* **1**. görmək; *After months at sea they sighted land Aylarla dənizdə olduqdan sonra onlar quru/torpaq gördülər*; **2**. müşahidə etmək/aparmaq; **3**. *hərb.* nişan almaq, nişana götürmək

**sightless** [ˈsaɪtlɪs] *adj* kor; **a ~ man** kor adam

**sightseeing** [ˈsaɪtsiːɪŋ] *n* diqqətəlayiq yerləri görmə; **to go ~** diqqətəlayiq yerləri görməyə getmək

**sign**[1] [saın] *n* 1. əlamət, nişanə; *A dark cloud is a sign of rain Qara bulud yağış əlamətidir; Tears are a sign of weakness Göz yaşları zəiflik əlamətidir*; 2. işarə; **in ~ of *smth.*** bir şeyin işarəsi; **traffic ~** yol işarəsi; **to make a ~ of the cross** xaç çevirmək/vurmaq; 3. şərti işarə; simvol, rəmz; *The signs used in arithmetic are +, -, x, : Hesabda istifadə edilən şərti işarələr bunlardır: +, -, x, :*; 4. reklam; elan; lövhə; göstərici; **illuminated ~s** işıq reklamları

**sign**[2] [saın] *v* 1. qol çəkmək, imza atmaq/etmək; **to ~ a document/a petition** sənədə/ərizəyə qol çəkmək; **to ~ in *smb.* else's name** bir kəsin əvəzinə qol çəkmək/imza atmaq; 2. işarə vermək *(əl-qol hərəkəti ilə)*; **to ~ assent/dissent** əl-qol hərəkəti ilə razılıq/narazılıq bildirmək; 3. işarə/nişan qoymaq, işarələmək, nişanlamaq; 4. xaç vurmaq/çevirmək; **to ~ away** vəsiyyət etmək *(mülkiyyəti və s.)*; **to ~ off** *d.d.* susmaq

**signable** ['saınəbl] *adj* qol çəkilə bilən; qol çəkilməli olan; **documents ~ by special persons** xüsusi şəxslər tərəfindən qol çəkilməli olan sənədlər

**signal**[1] ['sıgnəl] *n* 1. siqnal; **a ~ of distress** fəlakət siqnalı; **light ~s** işıq siqnalları; 2. əlamət; işarə; *His rising was a signal that the meeting was over Onun ayağa qalxması iclasın qurtarmasına işarə idi*

**signal**[2] ['sıgnəl] *adj* əlamətdar, əhəmiyyətli, mühüm; **~ achievement** əlamətdar/mühüm nailiyyət; **~ success** əlamətdar müvəffəqiyyət/uğur

**signal**[3] ['sıgnəl] *v* (-ll-) siqnal vermək; **to ~ by means of rockets** raket vasitəsi ilə siqnal vermək; *The ship signalled its distress Gəmi fəlakətə düşməsi haqda siqnal verdi*

**signalman** ['sıgnəlmən] *n (pl* **-men** [-mən]) 1. siqnalçı, siqnal verən; 2. *d.y.* strelkaçı, yolayıran *(dəmir yolunda)*

**signatory**[1] ['sıgnətrı] *n hüq.* imzalamış/təsdiq etmiş hökumət, imza atmış/imzalamış tərəf

**signatory**[2] ['sıgnətrı] *adj* imzalamış, təsdiqləmiş, qol çəkmiş, imza atmış; **~ powers to a treaty** müqaviləyə imza atmış/qol çəkmiş dövlətlər

**signature**[1] ['sıgnətʃəʳ] *n* 1. imza, qol; **to put *one's* ~ to a document** sənədə qolunu çəkmək, sənədə imza atmaq; **a document with two ~s** iki imzalı sənəd, iki qol çəkilmiş sənəd; 2. imzalanma, qol çəkilmə; *The contract is ready for signature Kontrakt/Müqavilə imzalanma üçün hazırdır*; 3. avtoqraf

**signature**[2] ['sıgnətʃəʳ] *v* qol çəkmək, imzalamaq, imza atmaq

**significance** [sıg'nıfıkəns] *n* 1. məna; **the real ~ of *smb.'s* words** bir kəsin sözünün həqiqi/əsl mənası; *Beauty has significance, but I didn't know it before Gözəlliyin mənası varmış, amma mən onu əvvəllər bilmirdim*; 2. vaciblik; **a matter of great ~** çox vacib məsələ; 3. çoxmənalılıq; **a look of deep ~** çoxmənalı baxış

**significant** [sıg'nıfıkənt] *adj* 1. vacib, əlamətdar, mühüm, əhəmiyyətli; **~ in its results** nəticəsi etibarilə əlamətdar; 2. çoxmənalı; **a ~ smile /look** çoxmənalı təbəssüm/baxış

**significantly** [sıg'nıfıkəntlı] *adv* əhəmiyyətli dərəcədə; *Profits have risen significantly Gəlirlər əhəmiyyətli dərəcədə artıb*

**signification** [,sıgnıfı'keıʃn] *n* 1. məna; **the ~ of a word** sözün mənası; 2. göstərmə; aşkarlama

**significative** [sıg'nıfıkətıv] *adj* vacib, əlamətdar, əhəmiyyətli; məna ifadə edən, mənalı

**signify** ['sıgnıfaı] *v (pt, pp* **-fied**) 1. ifadə etmək, bildirmək; **to ~ *one's* approval/*one's* satisfaction** özünün razılığını/məmnunluğunu bildirmək; *She signified her approval with a smile O, razılığını təbəssümlə bildirdi/ifadə etdi*; 2. göstərmək, bildirmək; əlaməti olmaq; *A red sunset signifies wind Qırmızı qürub külək əlamətidir*; 3. mənası olmaq, rol oynamaq, vacib olmaq; *It doesn't signify Bunun mənası yoxdur, Bu, vacib deyil*;

◊ *Please signify Zəhmət olmasa/Xahiş edirəm, səs verin/əlinizi qaldırın*

**signor** ['si:njɔ:ʳ] *n* cənab, ağa *(italyan dilində)*

**signora** [sı'njɔ:rə] *n* xanım *(italyan dilində)*

**silage**[1] ['saılıdʒ] *n k.t.* silos

**silage**[2] ['saılıdʒ] *adj* silos; **~ crop** silos bitkiləri; **a ~ tower** silos tayası/qülləsi

**silage**[3] ['saılıdʒ] *v k.t.* siloslamaq

**silence**[1] ['saıləns] *n* 1. sakitlik, sükut, səssizlik; **complete ~** tam sakitlik/sükut; **dead ~** tam sükut; **the ~ of the night** gecənin sükutu; **to break/to destroy the ~** sükutu pozmaq; *A scream broke the silence Qulaqbatırıcı bir qışqırtı sükutu pozdu*; **to keep ~** susmaq; **to pass *smth.* over in ~** bir şeyin üstündən sükutla keçmək; 2. susma; **to put/to reduce *smb.* to ~** bir kəsi susmağa məcbur etmək; *I can't understand her silence on the matter Bu məsələ barəsində onun susmağını başa düşə bilmirəm*; 3. unutma, yaddan çıxarma; xəbərsizlik;

◊ **great ~** ölüm, ölmə; *Silence gives consent at. söz. Susmaq razılıq əlamətidir; Silence is golden at. söz. Susmaq qızıldır*

**silence**[2] ['saıləns] *v* 1. susdurmaq, susmağa məcbur etmək; **to ~ the enemy's guns** düşmən toplarını susdurmaq; **to ~ a speaker** natiqi susdurmaq/susmağa məcbur etmək; 2. sakitləşdirmək; **to ~ a crying child** ağlayan uşağı sakitləşdirmək; 3. aradan qaldırmaq, dəf etmək, aşmaq *(maneəni və s.)*; 4. batırmaq, azaltmaq *(səsi)*; **to ~ a noise** səsi batırmaq

**silencer** ['saılənsəʳ] *n tex.* səsboğan

**silent** ['saılənt] *adj* 1. dinməz, danışmaz, sakit; dilsiz, nitqsiz; səssiz, səssiz-səmirsiz; **a ~ scene** sakit/səssiz-səmirsiz mənzərə; **a ~ film** səssiz film; **to be ~ about/on *smth.*** bir şey haqqında susmaq; *History is silent on this matter Bu məsələdə tarix susur*; **~ hills** sakit/səssiz-səmirsiz təpələr; *The engine is very silent Mühərrik səssiz işləyir*; 2. tələffüz edilməyən *(səs haq.)*; 3. fəaliyyətsiz, sönmüş; **~ volcano** sönmüş vulkan; 4. iyi/qoxusu olmayan, iysiz *(spirt haq.)*;

◊ **the ~ service** sualtı donanma



**silk**[1] [sılk] *n* 1. ipək, ipək parça; 2. ipək ip/sap; 3. *pl* ipək mallar, ipək parçadan tikilmiş paltarlar; **dressed in ~** ipək geymiş;

◊ **to hit the ~** paraşütdən tullanmaq

**silk**[2] [sılk] *adj* ipək; **a ~ dress/scarf/stocking** ipək paltar/ şərf/corab

**silken** ['sılkən] *adj* 1. ipək; zərif, yumşaq, ipək kimi zərif/yumşaq/parlaq; **a ~ gown** ipək libas /paltar; **~ hair** ipək kimi saç; **a ~ voice** zərif /yumşaq səs; 2. yaltaq, hiyləgər; **~ words** yaltaq sözlər/çıxış

**silkiness** ['sılkınıs] *n* ipəyə oxşama, ipək kimi yumşaqlıq/ zəriflik/parlaqlıq

**silkworm** ['sılkwə:m] *n* baramaqurdu, ipəkqurdu

**silky** ['sılkı] *adj* (-ier, -iest) ipək kimi, ipək kimi zərif/ yumşaq/parlaq/hamar; **~ hair** ipək kimi saç; **~ skin** ipək kimi yumşaq/zərif dəri

**sill** [sıl] *n* 1. kandar, astana *(qapıda)*; 2. pəncərə altı

**silliness** ['sılınıs] *n* sarsaqlıq, axmaqlıq, giclik, səfehlik, ağılsızlıq

**silly** ['sılı] *adj* (-ier, iest) axmaq, gic, ağılsız, səfeh; **a ~ little boy** axmaq/ağılsız/səfeh balaca oğlan; *Don't be silly Axmaq olma/olmayın*

**silo**[1] ['saılou] *n (pl* **-os** [-ouz]) 1. silos quyusu /qülləsi; 2. bunker *(kömür, sement saxlamaq üçün anbar)*

**silo**[2] ['saılou] *v* siloslaşdırmaq, silos basdırmaq

**silt**[1] [sılt] *n* 1. lil; 2. *amer.* ərp

**silt**[2] [sılt] *v (həm də* **to ~ up**) lillənmək, lilləmək; *The harbour has silted up Liman lillənib*

**silver**[1] ['sılvəʳ] *n* 1. gümüş; **fine ~** xalis/təmiz gümüş; 2. gümüşdən kəsilmiş/zərb edilmiş pul; **a pocketful of ~** bir cib/cibdolusu gümüş pul; **to change *one's* notes into ~** kağız pullarını gümüş pula dəyişmək; 3. gümüşdən hazırlanmış əşyalar/şeylər/medallar *(qaşıq, çəngəl və s.)*; *Harris won (the) silver for Canada Harris Kanada üçün gümüş medal qazandı*

**silver**[2] ['sılvəʳ] *adj* 1. gümüş; **a ~ mine** gümüş mədəni; **a ~ fork/spoon/coin** gümüş çəngəl/qaşıq/pul; 2. gümüşü, gümüş rəngli; **~ hair** gümüşü saç;

◊ **~ age** gümüş əsri; **~ wedding** gümüş toy

**silver**[3] ['sılvəʳ] *v* 1. gümüşləmək, gümüşlə örtmək; 2. gümüşlənmək, gümüşlə örtülmək; gümüş kimi parlamaq; *The edge of the spade was silvered from years of use İllərlə işlədildiyindən belin ağzı gümüş kimi parlayırdı*

**silvery** ['sılvərı] *adj* 1. gümüşü; **~ moon/clouds/ leaves** gümüşü ay/buludlar/yarpaqlar; 2. təmiz, aydın *(səs, ton haq.)*; **~ voice** təmiz/aydın səs; 3. gümüşlənmiş, gümüşə tutulmuş, gümüşlə örtülmüş; tərkibində gümüş olan

**silviculture** ['sılvıkʌltʃəʳ] *n* meşəçilik

**similar** ['sımıləʳ] *adj* 1. oxşar, bənzər; **~ in colour/in shape/in size** rəngə/formaya/ölçüyə görə oxşar; 2. *riyaz.* oxşar; **~ triangles** oxşar üçbucaqlar; 3. belə, bu kimi/cür, eyni cür; **cheese, butter, and other ~ food** pendir, yağ və bu kimi ərzaqlar

**similarity** [,sımə'lærətı] *n* 1. oxşarlıq, bənzərlik; **~ in/of style** üslubda oxşarlıq; *Their differences are more noticeable than their similarities Onların fərqləri oxşarlıqlarından çox gözə çarpır*; 2. *riyaz.* oxşarlıq

**similarly** ['sımıləlı] *adv* 1. eyni, oxşar; **to dress ~** eyni/oxşar geyinmək; *The two boys dress similarly Bu iki oğlan eyni/oxşar geyinirlər*; 2. müvafiq olaraq; *Similarly, the demand for copper has increased Müvafiq olaraq, misə olan tələbat da artıb*

**simmer**[1] ['sıməʳ] *n* 1. vamla/yavaş-yavaş qaynama; **to keep at a/on the ~** vamla qaynamanı davam etdirmək; 2. yavaş-yavaş qızdırma

**simmer**[2] ['sıməʳ] *v* 1. vamla qaynatmaq; 2. qurqur/luq-luq etmək; quruldamaq, qur-qur ilə axmaq; 3. coşmaq *(acıqdan, hirsdən)*; **to ~ with indignation** acıqdan/ hirsdən/ qəzəbdən coşmaq

**simper**[1] ['sımpəʳ] *n* ədabaz/mənasız təbəssüm

**simper**[2] ['sımpəʳ] *v* ədabaz-ədabaz /gic-gic gülümsəmək

**simple** ['sımpl] *adj* 1. asan, sadə; **~ task/problem/work** asan tapşırıq/problem/iş; **~ hypothesis/idea** sadə fərziyyə/fikir; **a ~ sentence** sadə cümlə; **a ~ house** sadə ev; **~ food** sadə yemək; **~ life** sadə həyat; **~ style** sadə üslub; 2. sadədil, sadəlövh, ürəyiaçıq; *He is as simple as a child O, uşaq kimi sadəlövhdür; He's so simple that he believes everything O, o qədər sadəlövhdür /ürəyiaçıqdır ki, hər şeyə inanır*; 3. tanınmayan, adi; **~ peasants** adi kəndlilər; 4. aydın, aşkar, şübhədoğurmayan; **a ~ fact** şübhədoğurmayan fakt/dəlil;

◊ **Simple Simon** sadədil/sadəlövh *(adam)*; **a ~ majority** sadə çoxluq

**simple-hearted** ['sımpl'ha:tıd] *adj* sadə, sadədil, sadəlövh, ürəyiaçıq

**simple-minded** ['sımpl'maındıd] *adj* sadədil, ürəyiaçıq; hiyləsiz; sadəlövh; *He thinks I'm simple-minded enough to believe him O fikirləşir ki, mən elə sadəlövhəm ki, ona inanacam, O fikirləşir ki, mən ona inanacaq qədər sadəlövhəm*

**simpleness** ['sımplnıs] *n* 1. sadəlik, bəsitlik, asanlıq, adilik; 2. sadədillik, ürəyiaçıqlıq, sadəlövhlük

**simpleton** ['sımpltən] *n arx.* sadədil, sadəlövh, axmaq, fərsiz, ağzıaçıq, maymaq *(adam)*

**simplicity** [sım'plısətı] *n* 1. sadəlik, asanlıq, bəsitlik; **the ~ of country living** kənd həyatının sadəliyi; **the ~ of the problem/question** problemin/məsələnin asanlığı; **the ~ of his style**

onun üslubunun bəsitliyi/sadəliyi; **the ~ of dresses** geyimin sadəliyi; 2. sadədillik, sadəlövhlük, ürəyiaçıqlıq; **the ~ of a child** uşağın sadədilliyi/ sadəlövhlüyü;

◊ **to be ~ itself** özlüyündə asan olmaq; *Cleaning the apparatus is simplicity itself – just wipe it over with a damp cloth Cihazı təmizləmək çox asandır – sadəcə olaraq onu yaş parça ilə sil, vəssalam*

**simplification** [ˌsɪmplɪfɪˈkeɪʃn] *n* sadələşdirmə, asanlaşdırma; bəsitləşdirmə; **a ~ of the rules** qaydaların sadələşdirilməsi/asanlaşdırılması

**simplified** [ˈsɪmplɪfaɪd] *adj* asanlaşdırılmış, sadələşdirilmiş, bəsitləşdirilmiş; **a ~ text** asanlaşdırılmış / sadələşdirilmiş mətn

**simplify** [ˈsɪmplɪfaɪ] *v (pt, pp* **-fied)** asanlaşdırmaq, sadələşdirmək, bəsitləşdirmək; **to ~ the explanation** izahatı asanlaşdırmaq/sadələşdirmək; *That will simplify my work/task O mənim işimi/tapşırığımı asanlaşdıracaq/ sadələşdirəcək*

**simply** [ˈsɪmplɪ] *adv* 1. sadə, adi; **to speak ~** sadə/adi danışmaq; **to live ~** adi/sadə yaşamaq; **to dress ~** sadə/ adi geyinmək; 2. açıq; **to speak ~** açıq danışmaq

**simulate** [ˈsɪmjuleɪt] *v* 1. yalandan özünü oxşatmaq/ göstərmək; özünü ... vurmaq, özünü ... kimi göstərmək/ qələmə vermək; **to ~ an illness** özünü xəstəliyə vurmaq/xəstə kimi göstərmək; **to ~ deafness/blindness** özünü karlığa/korluğa vurmaq; 2. təqlid etmək, yamsılamaq; **to ~ the voice/the gait of** ***smb.*** bir kəsin səsini/yerişini təqlid etmək

**simulated** [ˈsɪmjuleɪtɪd] *adj* qəlp, saxta, süni; **~ pearl** süni mirvari; **~ fur** süni xəz

**simulation** [ˌsɪmjuˈleɪʃn] *n* 1. sünilik; simulyasiya *(yalandan etmə/düzəltmə/özünü ... oxşatma)*; 2. saxtalıq, ikiüzlülük, riyakarlıq; 3. təqlid, təqlid etmə, yamsılama

**simulator** [ˈsɪmjuleɪtəʳ] *n* 1. hiyləgər/riyakar /ikiüzlü adam, özünü tülkülüyə qoyan adam; simulyant; 2. stimulyator

**simultaneity** [ˌsɪmltəˈnɪətɪ] *n* eynivaxtlılıq, eynizamanlılıq; eyni zamanda/vaxtda olma

**simultaneous** [ˌsɪmlˈteɪnɪəs] *adj* 1. eynizamanlı, eynivaxtlı, eyni vaxtda/zamanda baş verən; **~ events** eyni vaxtda baş verən hadisələr; **the ~ appearance of two books on the same subject** eyni fənn üzrə eyni vaxtda işıq üzü görən/çıxan iki kitab; **~ demonstrations** eyni vaxtda baş verən nümayişlər; 2. sinxron; **~ translation** sinxron tərcümə; *The conference delegates were provided with simultaneous translation of the speeches Konfransın nümayəndələri sinxron tərcümə ilə təmin edildi*

**simultaneously** [ˌsɪmlˈteɪnɪəslɪ] *adv* eyni zamanda/vaxtda, bir vaxtda/zamanda; *All the eggs hatched simultaneously Bütün yumurtalardan cücələr eyni vaxtda çıxdı*

**sin**[1] [sɪn] *n* günah; suç, təqsir; **deadly/mortal ~** çox ağır/ bağışlanılmaz günah; **to commit a ~** günah etmək/ işlətmək; **to confess** ***one's*** **~s to a priest** günahlarını keşişə açmaq/keşiş qarşısında etiraf etmək; *It's a sin to stay indoors on such a fine day Belə gözəl gündə evdə oturmaq günahdır*

**sin**[2] [sɪn] *v* **(-nn-)** 1. günah etmək/işlətmək, günaha batmaq; 2. pozmaq, riayət/əməl etməmək; **to ~ against the laws of society** cəmiyyətin qanunlarına əməl/riayət etməmək

**since**[1] [sɪns] *adv* 1. o zamandan/vaxtdan; *He came here in 1990 and has lived here since O bura 1990-cı ildə gəldi və o zamandan/vaxtdan burada yaşayır; I haven't seen them since Mən onları o vaxtdan görməmişəm*; 2. sonra, ondan sonra; *He was wounded a year ago, but has since fully recovered O, bir il bundan qabaq yaralandı, ondan sonra tam sağalıb; He at first refused, but has since consented O əvvəlcə imtina etdi, lakin sonra razılaşdı*; 3. bundan əvvəl/qabaq; *It happened many years since Bu çox illər bundan əvvəl/qabaq baş verdi*; **long ~** çoxdan; **not long ~** bu günlərdə/yaxınlarda, bir az bundan əvvəl; *This word has long since been out of use Bu söz çoxdan istifadədən çıxıb; I met him not long since in the city Mən ona bu günlərdə şəhərdə rast gəldim*

**since**[2] [sɪns] *prep* 1. *Müəyyən bir müddət davam edən hərəkətin başlanğıcını bildirir: Azərbaycan türkcəsində* **-dan, -dən** *şəkilçilərinə müvafiq gəlir*; **~ last month** keçən aydan; **~ last week** keçən həftədən; *I have been here since five o'clock Mən saat beşdən buradayam*; 2. sonra; *Since my last letter I have decided to meet her no more Axırıncı məktubumdan sonra mən onunla bir daha görüşməmək qərarına gəlmişəm*

**since**[3] [sɪns] *conj* 1. *Zaman budaq cümləsini baş cümləyə bağlayır: Azərbaycan türkcəsində* **-dan, -dən + (bəri)** *birləşməsinə uyğun gəlir; I've known him since he was a child Mən onu uşaqlığından tanıyıram; Nothing interesting has happened since we parted Biz ayrılandan bəri maraqlı heç nə olmayıb/baş verməyib*; 2. *Səbəb budaq cümləsini baş cümləyə bağlayır; Azərbaycan türkcəsində* **görə, çünki** *sözlərinə uyğun gəlir; Since I haven't got her address, I can't write to her Onun ünvanını bilmədiyimə* **görə** *mən ona məktub yaza bilmədim*

**sincere** [sɪnˈsɪəʳ] *adj* **(-r, -st)** 1. səmimi; **~ words** səmimi sözlər; **~ thanks** səmimi təşəkkürlər; *Please accept my sincere thanks Xahiş edirəm, mənim səmimi təşəkkürlərimi qəbul et/edin*; 2. şərəfli, namuslu, təmiz; **~ life** şərəfli/namuslu həyat

**sincerely** [sɪnˈsɪəlɪ] *adv* səmimiyyətlə, ürəkdən, qəlbdən, səmimi olaraq/surətdə; **to thank** ***smb.*** **~** bir kəsə məmnuniyyətlə/ürəkdən təşəkkür et-



mək; **yours ~ /~ yours** sizə dərin hörmət bəsləyən *(məktubun sonunda yazılan ifadə)*

**sincerity** [sɪnˈserɪtɪ] *n* səmimiyyət; **the warmth and ~ of his welcome** onun qarşılamasının hərarəti və səmimiyyəti; *I may say in all sincerity that you are my best friend Mən tam səmimiyyətlə deyə bilərəm ki, sən/siz mənim ən yaxşı dostumsan/dostumsunuz*

**sine** [saɪn] *n (qısa forması* **sin)** *riyaz.* sinus

**sinecure** [ˈsaɪnɪkjuəʳ] *n* yaxşı maaşlı yüngül vəzifə

**sinew**[1] [ˈsɪnjuː] *n* 1. vətər; damar; 2. *pl* əzələlər, fiziki güc/qüvvə; **a man of mighty ~s** əzələləri yaxşı inkişaf etmiş adam, böyük fiziki qüvvəyə malik adam; 3. hərəkətverici qüvvə; əsas; **the ~s of the sentence** hökmün əsası

**sinew**[2] [ˈsɪnjuː] *v* gücləndirmək, qüvvətləndirmək

**sinewy** [ˈsɪnjuːɪ] *adj* 1. damarlı; **a ~ meat** damarlı ət; 2. əzələli, qüvvətli, güclü; **~ arms** əzələli/qüvvətli qollar; **~ legs** əzələli/güclü qıçlar; 3. ifadəli, parlaq; **~ style** ifadəli/parlaq üslub

**sinful** [ˈsɪnfl] *adj* günahkar, günahlı; günahla dolu; **a ~ man** günahkar/günahlı adam; **a ~ life** günahla dolu həyat

**sinfulness** [ˈsɪnflnɪs] *n* günah, günahkarlıq

**sing** [sɪŋ] *v (pt* **sang** [sæŋ]; *pp* **sung** [sʌŋ]) 1. oxumaq *(mahnı)*; **to ~ a song** mahnı oxumaq; **to ~ to the guitar** gitara ilə oxumaq; **to ~ from score/from music** notla/notdan oxumaq; **to ~ in tune** düz oxumaq; **to ~ out of tune** xaric oxumaq; 2. oxunmaq; *These words don't sing well Bu sözlər yaxşı oxunmur (motivə yatmır)*; 3. sözləri uzada-uzada oxumaq; 4. dızıldamaq, vızıldamaq, vıyıldamaq; *The kettle is singing Çaydan dızıldayır; The mosquitoes sing around me Ağcaqanadlar mənim ətrafımda vızıldayırlar; An arrow sang Bir ox vıyıldadı*; 5. özünü öymək, öyünmək, lovğalanmaq; *There is nothing much to sing about Öyünməyə elə bir şey yoxdur*; 6. sevincdən döyünmək/titrəmək/əsmək; *Her heart sang for joy Onun ürəyi sevincdən titrədi/ əsdi/ çırpındı*

**singe**[1] [sɪndʒ] *n* yüngül yanıq, qaysaq

**singe**[2] [sɪndʒ] *v* **(*pr.p.* singeing)** 1. ütmək; **to ~ a fowl/a pig** quş/donuz ütmək; 2. qaysatmaq, yandırmaq *(üzdən)*; *The hot iron has singed the cloth İsti ütü paltarı yandırıb/ qaysadıb*

**singer** [ˈsɪŋəʳ] *n* 1. müğənni, xanəndə; 2. oxuyan quş, çalı quşu

**singing**[1] [ˈsɪŋɪŋ] *n* oxuma *(mahnı)*

**singing**[2] [ˈsɪŋɪŋ] *adj* 1. oxuyan; **a ~ bird** oxuyan quş, çalı quşu; **a ~ man** oxuyan adam, müğənni, xanəndə; 2. nəğmə; **a ~ teacher** nəğmə müəllimi

**single**[1] [ˈsɪŋgl] *adj* 1. yeganə, bir; **a ~ purpose** yeganə məqsəd; **a ~ eye-glass** monokl *(birgözlü eynək)*; *This beetle has single pair of wings Bu böcəyin bir cüt qanadı var*; 2. ayrı; **each ~ plant** hər bir bitki ayrılıqda; 3. təkbətək; **a ~ fight** təkbətək güləş; 4. bir, ümumi; *People worked with a single object İnsanlar bir məqsədlə işlədilər*; 5. tək; *He was left single and unsupported O, tək və köməksiz qaldı*; 6. subay; ərsiz; **a ~ man** subay kişi; **a ~ woman** ərsiz arvad; **to remain ~** subay/ərsiz qalmaq; 7. biradamlıq; **a ~ bed** biradamlıq çarpayı; **a ~ room** biradamlıq otaq;

◊ **~ heart/mind** safürəklilik, açıqürəklilik, düzlük, səmimilik

**single**[2] [ˈsɪŋgl] *v* müəyyənləşdirmək, müəyyən etmək; **to ~** ***one's*** **aim** məqsədini müəyyənləşdirmək/ müəyyən etmək; **to ~ out** seçmək; **to ~ out** ***smb.*** **for a reward** bir kəsi mükafata təqdim etmək/mükafat üçün seçmək

**single-breasted** [ˈsɪŋglˈbrestɪd] *adj* biryanlı *(paltar haq.)*

**single-celled** [ˈsɪŋglseld] *adj biol.* birhüceyrəli

**single-deck** [ˈsɪŋgldek] *adj dən.* birgöyərtəli *(gəmi haq.)*

**single-door** [ˈsɪŋgldɔːʳ] *n* birtaylı qapı

**single-engined** [ˈsɪŋglˈendʒɪnd] *adj* təkmotorlu, birmotorlu, təkmühərrikli; **a ~ plane** təkmühərrikli /təkmotorlu təyyarə

**single-eyed** [ˈsɪŋglˈaɪd] *adj* 1. taygöz, təkgözlü, birgözlü; 2. *məc.* səmimi, ürəyiaçıq, təmiz, vicdanlı, namuslu

**single-handed** [ˈsɪŋglˈhændɪd] *adj* birqollu, təkqollu, təkəlli, birəlli

**single-hearted** [ˈsɪŋglˈhaːtɪd] *adj* safürəkli, təmizürəkli, safdil, səmimi

**single-loader** [ˈsɪŋglˌloudəʳ] *n* təkatılan tüfəng

**singleness** [ˈsɪŋglnɪs] *n* 1. subaylıq, nikahsızlıq, kəbinsizlik; təklik; 2. vəhdət, birlik; bütövlük, vahidlik; **the ~ of nature's laws** təbiət qanunlarının vəhdəti

**single-seater** [ˈsɪŋglˌsiːtəʳ] *n* biryerli minik *(fayton, maşın və s.)*

**singlet** [ˈsɪŋglət] *n* 1. fufayka *(toxunmuş isti köynək)*; 2. *id.* mayka

**singular**[1] [ˈsɪŋgjələʳ] *n (qısa forması* **sing)** *qram.* tək; təkdə olan söz

**singular**[2] [ˈsɪŋgjələʳ] *adj* 1. qeyri-adi, tayı-bərabəri olmayan, çox gözəl, təkrarsız; **a ~ gift** xüsusi/qeyri-adi hədiyyə; **~ opportunity** qeyri-adi/çox gözəl imkan; **~ beauty** təkrarsız/qeyri-adi gözəllik; 2. özünəməxsus, xüsusi, başqalarından fərqlənən, qəribə; **a ~ dress** qəribə/ qeyri-adi paltar/geyim; 3. tək, tək-tək, az təsadüf edilən, nadir; **a ~ event** nadir/az təsadüf edilən hadisə; 4. *qram.* tək; **a ~ noun** tək isim; **nouns in the ~** təkdə olan isimlər

**singularity** [ˌsɪŋgjuˈlærɪtɪ] *n* 1. orijinallıq, qəribəlik, xüsusiyyət, müstəsnalıq, təkraredilməzlik; **~ of construction** konstruksiyanın orijinallığı müstəsnalığı; **~ of pattern** naxışın orijinallığı təkraredilməzliyi; 2. diqqətəlayiqlik, spesifiklik, xüsusiyyət; **the ~ of the rock** bu dağ süxurunun

xüsusiyyəti; 3. qeyri-adilik, qəribəlik; ~ **of manners** xasiyyətlərin/odaların qeyri-adiliyi

**singularly** [ˈsɪŋgjələlɪ] *adv* fövqəladə, qeyri-adi, son dərəcə, xüsusi bir tərzdə, olduqca, müstəsna surətdə; ~ **honest** olduqca vicdanlı/namuslu/sədaqətli; ~ **beautiful** olduqca/son dərəcə /müstəsna surətdə gözəl

**sinister** [ˈsɪnɪstəʳ] *adj* 1. yaramaz, çirkin; nəhs, məşum; qaşqabaqlı, qəmgin, kədərli, dərdli; **a ~ face** qəmli/kədərli sifət; ~ **glance** qəmli/kədərli baxış; ~ **symptoms** pis/məşum əlamətlər/simptomlar; 2. namussuz, şərəfsiz; anlaşılmaz, anlaşılmayan; şübhəli; **a ~ character** şübhəli şəxsiyyət; **in a ~ manner** şərəfsiz bir yolla; 3. alçaq, pis; ~ **influence** pis təsir; ~ **intentions** alçaq niyyətlər; 4. bədbəxt, uğursuz; ~ **accident** bədbəxt hadisə; ~ **fate** uğursuz tale; 5. fəlakətli, təhlükəli, xətərli; **a ~ place** təhlükəli/xətərli yer

**sink¹** [sɪŋk] *n* 1. çanaq, tas *(su kəmərində)*; 2. navalça, nov; 3. zibil quyusu; 4. çökəklik, oyuq, çuxur

**sink²** [sɪŋk] *v (pt* **sank** [sæŋk]; *pp* **sunk** [sʌŋk]) 1. batmaq; *The ship sank Gəmi batdı; My feet sank (down) into the mud Mənim ayaqlarım palçığa batdı*; **to ~ into snow/into the sand** qara/quma batmaq; *He sank up to his knees in the snow O, dizinə qədər qara batdı*; 2. batırmaq; *They sank the ship in the harbour Onlar gəmini limanda batırdılar*; 3. enmək, düşmək, çökmək; **to ~ to/on the ground** yerə enmək/düşmək; *She sank down on the steps O, pilləkənlərin üstündə yerə çökdü; The clouds are sinking Buludlar aşağı enir; Night is sinking Gecə düşür*; 4. aşağı düşmək, çökmək; *The foundation have sunk Bünövrə çöküb*; 5. zəifləmək; sönmək; *The storm/The wind is beginning to sink Tufan/Külək zəifləməyə başlayır*; 6. unutmaq, yaddan çıxartmaq; **to ~ *one's* own interests** öz şəxsi maraqlarını unutmaq; **to ~ the feud** düşmənçiliyi unutmaq; 7. arasından keçmək, keçmək, dammaq; *The rain will sink through the tent Yağış çadırdan damacaq*; 8. çökmək, batmaq *(yanaqlar və s. haq.); Her eyes have sunk (in) Onun gözləri çöküb/batıb*; 9. sancmaq, batırmaq; *The lion sank his teeth in his enemy's throat Şir dişlərini düşmənin boğazına sancdı/batırdı*; 10. sancılmaq, batmaq *(diş və s. haq.)*; 11. sancmaq, qazıb basdırmaq; *They sank the poles in the ground Onlar dirəkləri qazıb yerə basdırdılar*; 12. qoymaq *(kapitalı); He sank all his capital into house building O bütün kapitalını ev tikməyə qoydu*; **to ~ into a sleep/into a doze** yuxuya getmək, mürgüləmək; **to ~ into a faint** huşunu itirmək, ürəyi getmək; **to ~ into poverty** kasıblamaq; **to ~ the temperature to - 91°** temperaturu 91° dərəcəyə qədər azaltmaq/aşağı salmaq/endirmək;

◊ **to ~ into the grave** ölmək

**sinker** [ˈsɪŋkəʳ] *n* qursa, ağırlıq

**sinner** [ˈsɪnəʳ] *n* günahkar, tez-tez günah edən adam; **repentant ~s** tövbə edən günahkarlar

**sinuous** [ˈsɪnjuəs] *adj* 1. əyri-üyrü, dolanbac; **a ~ road among the mountains** dağların arasında əyri-üyrü yol; 2. *məc.* dolaşıq, qarışıq

**sinus** [ˈsaɪnəs] *n (pl* **sinuses**) *anat.* qoltuq, qoyun; boşluq; sinus *(bədəndə müxtəlif boşluqlara, çuxurlara və kanallara verilən ad)*

**sinusitis** [ˌsaɪnəˈsaɪtɪs] *n tib.* sinusit

**sip¹** [sɪp] *n* udum; **to take a ~ of wine** bir udum şərab/çaxır içmək

**sip²** [sɪp] *v* (-pp-) 1. udum-udum içmək; **to ~ wine** udum-udum şərab/çaxır içmək; 2. bal toplamaq *(arı haq.); The bees sip at every flower Arılar hər çiçəkdən bal toplayırlar*

**siphon¹** [ˈsaɪfn] *n* sifon *(müxtəlif səviyyədə duran mayenin bir borudan digərinə axıtmaq üçün boru)*

**siphon²** [ˈsaɪfn] *v* 1. sifon vasitəsilə axıtmaq *(həm də* **to ~ of/out**); 2. sifondan axmaq

**sir** [sɜːʳ] *n* 1. cənab *(ABŞ və İngiltərədə kişilərə müraciət); Good morning, sir Sabahınız xeyir, cənab*; 2. şagirdlərin kişi müəllimlərə müraciəti *(xüs. Britaniyada); Please, sir, can I open the window? Cənab, icazənizlə, pəncərəni açа bilərəmmi?*; 3. *müəyyən təşkilata və s. yazılan məktublarda işlənən müraciət (xüs. təşkilatın və s. rəhbərinin soyadını bilmədikdə); Dear Sir/Sirs Hörmətli Cənab/ Cənablar*; 4. **Sir** [səʳ] cəngavərlərin, baronların adı qarşısında işlədilən titul; *Thank you, Sir Edward Təşəkkür edirəm, Cənab Edvard; Sir John Jackson has arrived Cənab Con Cekson gəlib*

**sire** [ˈsaɪəʳ] *n* 1. *k.t.* döllük, damazlıq *(buğa, qoç, ayğır, donuz və s.)*; 2. *arx.* əlahəzrət *(Krala müraciət forması)*

**siren** [ˈsaɪrən] *n* 1. fit, fit səsi; **a ship's ~** paroxodun fiti/fit səsi; *The factory siren signalled the end of the night shift Fabrikin fiti gecə növbəsinin qurtardığını bildirdi*; 2. yoldan çıxaran/azdıran qız/qadın

**sirloin** [ˈsɜːlɔɪn] *n* can əti

**sirocco** [sɪˈrɔkou] *n* sirokko *(Afrikadan Cənubi Avropaya əsən isti quru külək)*

**sisel** [ˈsɪsəl] *n zool.* sünbülqıran *(siçanaoxşar gəmirici)*

**sissy** [ˈsɪsɪ] *n amer. d.d.* 1. bacı, kiçik bacı; 2. ərköyün, nazlı; ana uşağı, anasının balası *(oğlan haq.)*

**sister** [ˈsɪstəʳ] *n* 1. bacı; **full ~** doğma bacı; **my big/ little ~** mənim böyük/balaca bacım; *Have you any sisters? Sənin/Sizin heç bacın/bacınız varmı?; She is like a sister to me O mənə bacı kimidir*; 2. tibb bacısı; 3. *amer.* qadınlara müraciət forması

**sisterhood** [ˈsɪstəhud] *n* 1. bacı, bacı münasibəti; **to live in loving ~** sevimli bacı kimi yaşamaq; 2. *top.i* bacılar; 3. *məc.* ittifaq, qardaşlıq, dostluq; **to join the ~ of nations** xalqların qardaşlıq/dostluq ailəsinə qoşulmaq/daxil olmaq



**sister-in-law** [ˈsɪstərɪnlɔː] *n (pl* **sisters-in-law**) gəlin, baldız, qardaşarvadı

**sisterly** [ˈsɪstəlɪ] *adj* bacı; ~ **love** bacı məhəbbəti; **a ~ kiss** bacı öpüşü

**sit¹** [sɪt] *n* 1. oturacaq; 2. oturma, durma, tutma *(paltar haq.); They saw the perfect sit of her dress Onlar gördülər ki, paltarı ona yaxşı oturur/durur/yaraşır*; 3. *d.d.* yer, vəzifə, iş

**sit²** [sɪt] *v (-tt-; pt, pp* **sat** [sæt]) 1. oturmaq, əyləşmək; **to ~ at a table** stol arxasında oturmaq; **to ~ in an armchair** kresloda oturmaq; *Please sit down Zəhmət olmasa oturun/əyləşin*; **to ~ on the throne** taxtda oturmaq/ əyləşmək, hakimiyyətə gəlmək; *Let me sit on the sofa Qoy/qoyun divanın üstündə oturum*; 2. iclas etmək/ aparmaq; *(The) Parliament will sit in (the) autumn Parlament iclası payızda olacaq; The House of Commons will sit at eight o'clock İcmalar Palatasının iclası saat səkkizdə başlanacaq*; 3. baxmaq, nəzərdən keçirmək, araşdırmaq; **to ~ over/on a case** işi araşdırmaq, işə baxmaq; 4. ciddi surətdə məşğul olmaq *(bir şeylə)*; **to ~ over a book/a problem** kitabla/problemlə ciddi surətdə məşğul olmaq; **to ~ at work** səbirlə (oturub) işləmək; **to be ~ting for an examination** səbirlə imtahana hazırlaşmaq; 5. qalmaq, oturmaq; **to ~ at home** 1) evdə qalmaq/oturmaq; 2) heç nə etməmək, boş-boşuna oturmaq; 6. tutmaq; *This hall sits five hundred people Bu zal beş yüz adam tutur*; 7. gizlənmək, durmaq *(pusquda); They sat behind the trees Onlar ağacların dalında gizləndilər*; 8. tutmaq, oturmaq, durmaq *(paltar haq.); The coat sits badly on him Palto onu pis tutur*; 9. bala çıxartmaq, yumurta üstündə yatmaq *(quş haq.)*; **to ~ back** 1) söykənmək *(divara, stolun arxasına və s.)*; 2) boş-bikar gəzmək, tənbəllik etmək, avara gəzmək, veyllənmək; **to ~ down** 1) aşağı oturmaq; 2) *av.* yerə oturmaq/enmək; **to ~ in** 1) valideynlər olmayanda uşağa baxmaq; 2) iştirak etmək *(komissiyanın işində və s.)*, iclas keçirmək; **to ~ out** 1) axıra/sona qədər oturmaq; **to ~ out a concert** konsertin sonuna qədər oturmaq; 2) qatılmamaq, kənarda durmaq; **to ~ out a dance** rəqsdə iştirak etməmək, rəqsə qatılmamaq;

◊ **to ~ in judgement** 1) məhkəmələik etmək, məhkəmə iclası aparmaq; 2) hökm çıxartmaq; **to ~ for an examination** imtahan vermək; **to ~ longer than a hen** qonaqlıqda düşüb qalmaq/çox oturmaq; **to ~ on the fence/on the rail** gözləmək, gözləmə mövqeyi tutmaq; **to ~ pretty** əlverişli mövqedə olmaq

**sit-down** [ˈsɪtdaun] *adj* oturaq; ~ **strike** oturaq tətil, oturaq nümayiş

**site¹** [saɪt] *n* 1. olduğu yer, yer; **the ~ of a building/of a town** binanın/şəhərin olduğu yer; **the ~ of a battle** döyüş/ vuruş yeri; 2. tikinti üçün yer; **a ~ for a new building/ for a new school** yeni bina/məktəb tikmək üçün yer; 3. qədim insanın məkanı

**site²** [saɪt] *v* 1. yerləşdirmək, yer eləmək; 2. yerləşmək, sığmaq; 3. yer seçmək *(tikinti və s. üçün)*

**sitting** [ˈsɪtɪŋ] *n* 1. oturma; *Long sitting is fatiguing Çox oturma yorucudur*; 2. iclas, sessiya; **opening ~** açılış iclası, açılış *(konfransda və s.)*; **final ~** son/yekun iclas; **public ~** açıq iclas; **~ of the court/of a committee** məhkəmənin/komitənin iclası; **~ of Parliament** Parlamentin iclası; 3. qırt yatma, cücə çıxartma; 4. qırt toyuğun altındakı yumurta; 5. oturacaq, oturacaq yeri

**sitting hen** [ˈsɪtɪŋhen] *n* qırt toyuq

**sitting-room** [ˈsɪtɪŋrum] *n* 1. ümumi istifadə otağı, qonaq otağı *(kiçik)*; 2. oturmaq üçün yer/məkan; **~ for two here** burada iki adama yer

**situate** [ˈsɪtjueɪt] *v (əsas. məchulda işlənir)* yerləşdirmək, yerləşmək; *The village is situated in a valley Kənd bir dərədə yerləşir*

**situated** [ˈsɪtjueɪtɪd] *adj* 1. yerləşmiş; **a badly ~ village** pis yerləşmiş kənd; 2. müəyyən vəziyyətdə olan; **to be awkwardly ~** çətin vəziyyətdə olmaq; *Having six children and no income, I was badly situated Altı uşağım olduğundan və heç bir gəlirim olmadığına görə mən pis vəziyyətdə idim*

**situation** [ˌsɪtjuˈeɪʃn] *n* 1. situasiya, vəziyyət; **financial ~** maliyyə vəziyyəti; **international ~** beynəlxalq vəziyyət; **the ~ at the front** cəbhədə vəziyyət; **to be in a dangerous ~** təhlükəli vəziyyətdə olmaq; **to get into a difficult ~** çətin vəziyyətə düşmək; **to get out of a difficult ~** çətin vəziyyətdən çıxmaq; **the worsening of financial ~** maliyyə vəziyyətinin pisləşməsi; **dramatic ~** dramatik situasiya; **tense ~** gərgin vəziyyət/situasiya; 2. yer, vəzifə, iş; **the ~ of a servant/of an employee** xidmətçi/qulluqçu yeri; **to find a ~** iş/qulluq tapmaq; **to leave a ~** işdən/qulluqdan çıxmaq; 3. yer; *The farm stands in a fine situation Ferma gözəl bir yerdə yerləşir*; 4. yerləşdiyi yer; **the ~ of a house/of a city** evin/şəhərin yerləşdiyi yer; 5. *d.d.* üç birinci yerdən biri *(cıdırda)*;

◊ **to be in an interesting ~** maraqlı vəziyyətdə olmaq

**six** [sɪks] *num* 1. altı; *She is six Onun altı yaşı var; Six and six make twelve Altı üstəgəl altı on iki eylər; She'll come at six O, saat altıda gələcək; There were six of them Onlar altı nəfər idilər*; 2. altıncı; **chapter ~** altıncı fəsil; **Room ~** altıncı otaq; 3. altılıq *(kartda)*; **~ of spades** altılıq qaratoxmaq; 4. altı nəfər; **in ~** altı-altı; 5. *pl* altı nömrəli əlcək, və s.

**sixfold¹** [ˈsɪksfould] *adj* altıqat, altı qat artıq/çox

**sixfold²** [ˈsɪksfould] *adv* altı dəfə çox; **to increase ~** altı dəfə çoxaltmaq/artırmaq

**sixteen** [ˌsıks'ti:n] *num* 1. on altı; *Sixteen and sixteen make thirty-two On altı üstəgəl on altı otuz iki eylər; There were sixteen of them Onlar on altı nəfər idilər;* 2. on altıncı; **chapter/page ~** on altıncı fəsil/səhifə; **Room ~** on altıncı otaq; 3. on altı yaş; *She is sixteen Onun on altı yaşı var, O, on altı yaşındadır;* **a girl of ~** on altı yaşlı qız

**sixteenth¹** [ˌsıks'ti:nθ] *num* on altıncı; **the ~ room/lesson** on altıncı otaq/dərs

**sixteenth²** [ˌsıks'ti:nθ] *adv* on altıncı; *He came sixteenth O, on altıncı gəldi*

**sixth¹** [sıksθ] *n* altı, altı rəqəmi; **on the ~ of May** mayın altısında

**sixth²** [sıksθ] *adv* altıncı; *He came sixth O, altıncı gəldi*

**sixties** ['sıkstız] *num* 1. *altmışdan altmış doqquza qədər olan rəqəmlər;* 2. altmışıncı illər; 3. altmışdan altmış doqquza qədər olan yaş; *She's in the early sixties Onun yaşı altmışdan bir az çoxdur*

**sixtieth¹** ['sıkstııθ] *num* altmışıncı; **~ person** altmışıncı adam

**sixtieth²** ['sıkstııθ] *adv* altmışıncı; *He came sixtieth O, altmışıncı gəldi*

**sixty** ['sıkstı] *num* 1. altmış; **~ children** altmış uşaq; 2. altmışıncı; **page ~** altmışıncı səhifə; **Room ~** altmışıncı otaq; 3. altmış yaş; **at ~** altmış yaşında; **a woman of ~** altmış yaşlı qadın; *He must be about sixty O təxminən altmış yaşında olmalıdır*

**sizable** ['saızəbl] *adj* böyük, böyük ölçülü; **a ~ achievement** böyük nailiyyət; **a ~ town** böyük (ölçülü) şəhər

**size¹** [saız] *n* 1. ölçü, böyüklük, miqdar; **a small ~** kiçik ölçü; **a ~ of a match box** kibrit qutusu böyüklüyündə; **the ~ of an army** ordunun miqdarı/sayı; **~ in pages** səhifələrin miqdarı; **the ~ of a building** binanın ölçüsü/ böyüklüyü; **to be of a/one ~** eyni ölçüdə olmaq; *They're both of a size Onlar eyni ölçüdədirlər;* 2. ölçü *(geyim haq.)*; **to wear a large/a small ~ in boots/in gloves/in hats** böyük ölçülü/kiçik ölçülü çəkmə/əlcək/papaq geymək; 3. mirvari ölçmək üçün alət;

◊ **to cut *smb.* down to ~** bir kəsə yerini göstərmək/ başa salmaq

**size²** [saız] *v* 1. yerləşdirmək, yerbəyer etmək, düzmək, sahmanlamaq *(həm də* **to ~ out***)*; **to ~ soldiers** əsgərləri düzmək *(boy sırasına görə)*; 2. ölçünü/böyüklüyü müəyyən etmək; 3. fikir yaratmaq, qiymətləndirmək; **to ~ up a man** insanı/adamı düzgün qiymətləndirmək; **to ~ up** qiymətləndirmək; **to ~ up a situation** vəziyyəti düzgün başa düşmək/ qiymətləndirmək

**sizeable** ['saızəbl] *adj* = **sizable**

**sizzle¹** ['sızl] *n d.d.* 1. cızıltı, cızıldama, dızıltı, dızıldama; 2. bərk isti, al günün altı

**sizzle²** ['sızl] *v* 1. *d.d.* cızıldamaq, dızıldamaq; 2. yandırmaq, qarsalandırmaq, kül etmək, yandırıb külə döndərmək

**sizzler** ['sızlə^r] *n d.d.* çox/bərk isti gün; *Yesterday was a real sizzler Dünən həqiqətən çox isti idi*

**sizzling** ['sızlıŋ] *adj* 1. yandıran, çox isti; **a ~ spell of weather** çox isti hava; 2. çox həyəcanlı; *The film contains several sizzling scenes Filmdə bir sıra həyəcanlı səhnələr var*

**skate¹** [skeıt] *n* konki *(buz üstündə sürüşmək üçün ayaqqabıya taxılan dəmir xizəkciklər)*

**skate¹** [skeıt] *v* 1. konkidə sürüşmək/qaçmaq; 2. konkidə qaçmaq üzrə yarışda iştirak etmək; **to ~ a match** konki sürmə yarışında iştirak etmək; **to ~ *smb.*** bir kəslə konki sürmədə yarışmaq;

◊ **to ~ over/on thin ice** 1) çətin vəziyyətdə olmaq; 2) uçurumun kənarı ilə getmək/yerimək

**skater** ['skeıtə^r] *n* konki sürən; **a long-distance ~** uzaq məsafəyə konki sürən; **a short-distance ~** yaxın məsafəyə konki sürən

**skating** ['skeıtıŋ] *n* konki sürmə, konkidə sürüşmə; konki sürmə idmanı, konki idmanı; **single ~** tək sürüşmə *(konkidə)*; **pair ~** cüt sürüşmə *(konkidə)*

**skating-rink** ['skeıtıŋrıŋk] *n* katok *(konkidə sürüşmək üçün buz meydançası)*

**skedaddle** [skı'dædl] *v d.d.* qaçmaq, qaçıb getmək, əkilmək

**skeletal** ['skelətl] *adj* 1. skelet; **~ muscle** *anat.* skelet əzələsi; 2. skeletəbənzər, skeletəoxşar

**skeleton** ['skelıtn] *n* 1. skelet; **human/animal ~** insan/ heyvan skeleti; **to be reduced/to shrivel to a ~** skeletə dönmək/döndərilmək, çox/həddən artıq arıqlamaq; 2. bünövrə; gövdə, karkas *(bir şeyin gövdəsi/əsası)*; **the steel ~ of a building** binanın metal karkası; 3. sxem, plan, eskiz, layihə; **the ~ of a speech/of a lecture** nitqin/mühazirənin eskizi;

◊ **~ in the cupboard/in the closet** gizli/gizlədilən sirr; **the family ~** ailə sirri

**sketch¹** [sketʃ] *n* 1. eskiz, layihə; şəkil; **chalk ~** təbaşirlə çəkilən eskiz; 2. oçerk; kiçik məqalə; qısa xülasə; **a historical ~** tarixi oçerk; **brief /concise ~** qısa/yığcam məqalə; **a critical ~** tənqidi xülasə; 3. *teatr.* skeç *(estrada üçün yazılmış kiçik məzhəkə, pyes)*

**sketch²** [sketʃ] *v* 1. eskizini çəkmək/cızmaq; **to ~ *smb.'s* figure** bir kəsin fiqurasının şəklini çəkmək; 2. ümumi şəkildə təsvir etmək *(həm də* **to ~ out***)*; **to ~ out a plan** planı ümumi şəkildə təsvir etmək; **to ~ (out) the situation in a few words** vəziyyəti bir neçə sözlə təsvir etmək

**sketch-board** ['sketʃbɔ:d] *n* planşet *(çertyoj kağızını sərib üstündə işləmək üçün lövhə/taxta)*

**sketch-book** ['sketʃbuk] *n* 1. etüd qovluğu; 2. qeyd dəftəri

**sketchily** ['sketʃılı] *adv* sxematik olaraq, ümumi şəkildə, qısa

**sketchiness** ['sketʃınıs] *n* 1. sxematiklik, səthilik; qısalıq; 2. etibarsızlıq, davamsızlıq

**sketchy** ['sketʃı] *adj* (-ier, -iest) 1. sxematik, ümumi



şəkildə; qısa; səthi; **a ~ knowledge** səthi/sxematik bilik; *The lecture was too sketchy to be much good Mühazirə sxematik olduğu üçün çox da fayda vermədi;* 2. etibarsız, davamsız, tezsınan, tezdağılan; bir təhər düzəldilmiş; **~ window-shutters** etibarsız/davamsız pəncərə qapaqları; 3. atüstü, ayaqüstü; **to have a ~ dinner** atüstü/ayaqüstü nahar etmək

**skew¹** [skju:] *n* 1. eniş; təmayül; maillik; əyilmə; **on the ~** çəpəki, çəpinə; 2. düz xətdən kənara çıxma; 3. çaşma, yanılma, yanlış fikir; qüsur, pozğunluq, təhrif

**skew²** [skju:] *adj* çəp, çəpəki; **a ~ arch** çəp/çəpəki sütun

**skew³** [skju:] *v* 1. yayınmaq, yana/kənara çəkilmək, sapmaq; çevirmək, yerindən tərpətmək; yana/kənara çəkmək; 2. çəkmək, çəkib vurmaq *(nasosla bir yerdən başqa yerə)*; 3. qorxub kənara çəkilmək/atılmaq; 4. **(at, upon)** əyri/çəp baxmaq; **to ~ at/upon *smb.*** bir kəsə əyri/çəp baxmaq; 5. **(at, upon)** eyham vurmaq, söz atmaq, işarə etmək; 6. təhrif etmək, dəyişdirmək, saxtalaşdırmaq;

◊ **to be ~ed** 1) kəsilmək *(imtahanda)*; 2) qulaqburması almaq, bərk məzəmmətlənmək

**skewbald¹** ['skju:bɔ:ld] *n* ala at

**skewbald²** ['skju:bɔ:ld] *adj* ala; **a ~ horse** ala at

**skewer¹** ['skju:ə^r] *n* şiş

**skewer²** ['skju:ə^r] *v* şişə taxmaq; **to ~ a fish** balığı şişə taxmaq

**skew-eyed** ['skju:'aıd] *adj* çəpgöz, qıyıqgöz, əyrigöz, çaş

**ski¹** [ski:] *n* xizək; **a pair of ~es** bir cüt xizək; **to put on *one's* ~s** xizəklərini geymək/taxmaq

**ski²** [ski:] *adj* xizək; **~ equipment/instructions** xizək ləvazimatı/təlimatları; **a ~ depot** xizək bazası; **a ~ clamp/ pole** xizək dayağı/ağacı

**ski³** [ski:] *v (indiki zaman üçüncü şəxs təkdə:* **skis;** *pt, pp* **skid** *və ya* **skied;** *pr.p* **skiing)** xizəkdə sürüşmək *(qar üzərində)*; *We skied down to the village Biz xizəklə kəndə aşağı sürüşdük*

**skid** [skıd] *v* (-dd-) sürüşmək *(nəqliyyat haq.)*; *The car skidded and went straight into the wall Maşın sürüşdü və düz divara dəydi; The bus skidded off the road Avtobus sürüşüb yoldan çıxdı*

**skier** ['ski:ə^r] *n* xizəkçi, xizək sürən

**skies** [ski:z] **ski** *isminin cəm forması*

**skiing¹** ['ski:ıŋ] *n* 1. xizək idmanı; 2. xizəklə sürüşmə; **to go on ~** xizəklə sürüşmək

**skiing²** ['ski:ıŋ] *adj* 1. xizək; **a ~ champion** xizək sürmə üzrə çempion; **a ~ coach** xizək sürmə üzrə məşqçi; **~ suit** xizək kostyumu; **a ~ race** xizək sürmə yarışı; **~ gear** xizək sürmə ləvazimatı

**skilful** ['skılfl] *adj* mahir, məharətli, qabil, bacarıqlı, usta; təcrübəli; **a ~ surgeon** mahir/ məharətli/təcrübəli cərrah; **a ~ mechanic** usta/təcrübəli mexanik; **a ~ painter** mahir/qabil rəssam; **a ~ driver** mahir/usta/təcrübəli sürücü; **to be ~ at/in carpentry** dülgərlikdə mahir olmaq; **a ~ answer** qabil/məharətli cavab

**skilfully** ['skılfəlı] *adv* bacarıqla, mahiranə, ustalıqla, məharətlə

**skill** [skıl] *n* 1. ustalıq, məharət, sənətkarlıq; **exceptional ~** müstəsna ustalıq/sənətkarlıq; **matchless ~** misilsiz/tayı-bərabəri olmayan ustalıq/məharət; **a job requiring great ~ and attention** böyük ustalıq və diqqət tələb edən iş; **a poet of considerable ~** çox məharətli şair; **~ in diplomacy** diplomatiyada məharət; **~ in lecturing** mühazirə oxumaqda məharət/ustalıq; 2. bacarıq; **~ in debate** mübahisə aparmaq bacarığı; **to show ~ in boxing** boksda bacarıq nümayiş etdirmək; 3. istedad, qabiliyyət; **creative ~** yaradıcılıq istedadı/qabiliyyəti; 4. sənət, peşə; **ancient ~** qədim sənət/peşə; **journalistic ~** jurnalistlik sənəti/peşəsi

**skilled** [skıld] *adj* təcrübəli, məharətli, bacarıqlı; **a ~ watchmaker** təcrübəli/məharətli saatsaz; **a ~ worker** təcrübəli/bacarıqlı fəhlə

**skillet** ['skılıt] *n* sapılca

**skillful** ['skılfl] *adj* = **skilful**

**skim** [skım] *v* (-mm-) 1. üzünü almaq *(südün)*; **to ~ milk** südün üzünü almaq; 2. səthlə yüngül və cəld hərəkət etmək/sürüşmək; *A skater skims the ice Konki sürən buz üzərində sərbəstcə sürüşür;* 3. lap üstündən keçmək; *The aeroplane skimmed above/over the houses Təyyarə lap evlərin üstündən uçdu;* 4. *(adət.* **over)** səthi tanış olmaq *(bir şeylə)*; **to ~ (over) a subject** fənlə səthi tanış olmaq; 5. *(adət.* **over, through)** nəzərdən keçirmək; bir işi başdansovdu görmək; **to ~ over/through a book/a document** kitabı/sənədi nəzərdən keçirmək; *Read carefully, do not skim Diqqətlə oxu/oxuyun, başdansovdu oxuma/oxumayın*

**skimmed** [skımd] *adj* üzü alınmış; **~ milk** üzü alınmış süd

**skimmer** ['skımə^r] *n* 1. kəfkir; 2. süd separatoru; 3. alçaq təpəli və enli kənarlı qadın şlyapası; 4. qlisser *(yastıdibli itigedən qayıq)*; 5. *av. d.d.* hidroplan

**skimming** ['skımıŋ] *n* qaymağı/köpüyü alma, ərpi təmizləmə

**skimp¹** [skımp] *adj d.d.* kasıb, yoxsul; zəif, az, cüzi

**skimp²** [skımp] *v d.d.* 1. pis təmin etmək; kəsmək; xəsislik/simiclik etmək, əsirgəmək; **to ~ *smb.* with/in food** bir kəsin ərzağını kəsmək; **to ~ on food to save money** pul yığmaq üçün yeməkdə simiclik/xəsislik etmək; **to ~ and screw** xəsislik/simiclik etmək; 2. *amer.* necə gəldi/başdansovdu/səliqəsiz etmək

**skimpy** ['skımpı] *adj* 1. çox az/cüzi; kasıb, yoxsul; zəif; **a ~ meal** çox az/cüzi yemək; 2. dar *(paltar haq.)*; *The dancers wore skimpy dresses Rəqqasələr dar paltar geymişdilər;* 3. xəsis, simic; qənaətçi, qənaətcil, qənaətli

**skin¹** [skın] *n* 1. dəri; **clear/dry/tender ~** tə-

miz/quru/zərif dəri; *She has beautiful skin Onun gözəl dərisi var*; **tiger's/lion's ~** pələng /aslan dərisi; 2. qabıq *(meyvədə, tərəvəzdə, ilanda)*; **the ~ of an apple/of a banana/of an orange/of an onion/of a potato** almanın/ bananın/ portağalın/soğanın/kartofun qabığı; **to peel the ~ off a banana/off an apple/off an orange** bananın/ almanın/ portağalın qabığını soymaq; **snake's ~** ilan qabığı; 3. tuluq *(şərab və s. saxlamaq üçün)*; 4. pərdə, üz *(qaynadılmış mayenin üzündə əmələ gələn qat)*; **the ~ on boiled milk** qaynadılmış südün üzü;

◊ **to be mere/only ~ and bone(s)** bir dəri, bir sümük olmaq, həddindən artıq arıq olmaq; **to have a thick ~** dərisi qalın olmaq *(yəni hissiyyatını itirmiş olmaq)*; **to have a thin ~** həssas olmaq, tez mütəəssirlənmək; **to change *one's* ~** tanınmaz dərəcədə dəyişmək

**skin[2]** [skın] *adj* dəri; **a ~ disease** dəri xəstəliyi

**skin[3]** [skın] *v* 1. dərisini soymaq; **to ~ a rabbit/a sheep/a goat/a fox** krolikin/qoyunun/ keçinin/tülkünün dərisini soymaq; 2. qabığını soymaq; **to ~ a fruit** meyvənin qabığını soymaq; 3. tük tökmək *(heyvan haq.)*; **to ~ out** qaçıb aradan çıxmaq; **to ~ over** bitişmək, sağalmaq *(yara haq.)*; *The wound began to skin Yara sağalmağa başladı*;

◊ **to ~ alive** 1) diri-diri dərisini soymaq; 2) dərisini soymaq; öldürücü zərbə endirmək; **to ~ a lamb** fırıldaqçılıq/hiyləgərlik/dələduzluq etmək

**skin-deep** [ˈskınˈdi:p] *adj* 1. üzdən, yüngül; **~ wound** yüngül/dərin olmayan yara; 2. ötəri, ani, tez ötüb keçən; **~ impression** ötəri/tez ötüb keçən təəssürat

**skinflint** [ˈskınflınt] *n* 1. xəsis/simic/zıqqı adam; 2. qansoran/müftəxor/rəhmsiz adam

**skinful** [ˈskınful] *n* 1. bir tuluq, tuluq dolusu; 2. *d.d.* çox, çox miqdarda, istənilən qədər; **a ~ of food/of drink** istənilən qədər ərzaq/içki

**skinny** [ˈskını] *adj* (**-ier, -iest**) arıq; **a ~ child** arıq uşaq

**skip[1]** [skıp] *n* 1. atılma, hoppanma, tullanma, sıçrama; sıçrayış; alıtıb-düşmə; **to give a ~ for joy** sevincdən atılmaq/tullanmaq/atılıb-düşmək; *How many skips can you do without stopping Dayanmadan sən/siz neçə dəfə atılıb-düşə bilərsən?/bilərsiniz?*; **hop, ~ and jump** *id.* üçqat tullanma/hoppanma; 2. *d.d.* rəqs etmək

**skip[2]** [skıp] *v* (**-pp-**) 1. atılmaq, sıçramaq, hoppanmaq; **to ~ out of the way** yoldan kənara atılmaq/sıçramaq; 2. ipin üstündən hoppanmaq/atılıb-düşmək, oynaqlamaq, oynaqlaşmaq *(həm də* **to ~ about**); *The lambs were skipping about in the field Quzular çöldə atılıb-düşürdülər/oynaqlayırdılar; Children are skipping in the playground Uşaqlar oyun meydançasında oynaqlaşırlar*; 3. bir mövzudan başqasına keçmək; *She kept skipping from one topic of conversation to another O tez-tez söhbəti bir mövzudan o birinə keçirirdi*; 4. atlana-atlana/ hoppana-hoppana qaçmaq; **to ~ along the road** yol uzunu hoppana-hoppana/ tullana-tullana qaçmaq; **to ~ (over) a brook** kiçik çayın üstündən hoppanmaq/ tullanmaq; 5. buraxmaq; **to ~ certain questions** müəyyən məsələləri buraxmaq; 6. *d.d.* **(out)** ölmək;

◊ *Skip out! Bəsdir! Bəsdirin!*

**skipper** [ˈskıpəʳ] *n* 1. *dən.* skiper *(ticarət gəmisinin kapitanı)*; 2. *dən. d.d.* gəmi komandiri; 3. *d.d.* komandanın kapitanı *(idmanda)*; 4. *d.d.* sahib, sahibkar, boss; 5. *d.d.* şeytan, iblis

**skirmish[1]** [ˈskə:mıʃ] *n* 1. toqquşma, dalaşma; *He fell in a skirmish O, toqquşmada həlak oldu*; 2. atışma

**skirmish[2]** [ˈskə:mıʃ] *v* 1. vuruşmaq, döyüşmək; tutaşmaq, əlbəyaxa olmaq; 2. atışmaq

**skirt[1]** [skə:t] *n* 1. yubka; **a long/a short ~** uzun/gödək yubka; **to wear short/long ~** qısa/uzun yubka geymək; 2. *adət. pl* kənar, sərhəd; **on the ~s of a town** şəhərin kənarlarında; 3. sahil *(göl, çay haq.)*; 4. meşə kənarı; 5. zolaq; **a broad ~ of thickets** pöhrəliyin geniş zolağı

**skirt[2]** [skə:t] *v* dövrə vurmaq, dolanmaq, dolanıb keçmək, ətrafından keçmək; *We skirted (round) the field and crossed the bridge Biz çölü dolandıq və körpüdən keçdik*

**skirt-board** [ˈskə:tbɔ:d] *n* ütüləmək üçün taxta

**skulk[1]** [skʌlk] *n* veyl, avara, tənbəl, əlindən iş gəlməyən *(adam)*

**skulk[2]** [skʌlk] *v* 1. yavaş-yavaş/gizlincə yaxınlaşmaq/ keçmək, xəlvəti aradan çıxmaq *(həm də* **to ~ away**); **to ~ through back door** xəlvətcə dal qapıdan çıxmaq; **to ~ into/out of the town** xəlvətcə şəhərə daxil olmaq/ şəhərdən çıxmaq; **to ~ round the house** gizlincə evin ətrafından keçib getmək; 2. gizlənmək *(həm də mac.)*; **to ~ in woods** meşələrdə gizlənmək; **to ~ behind the laws** qanunlar arxasında gizlənmək; 3. vəzifəsini yerinə yetirməkdən boyun qaçırmaq/imtina etmək, işdən boyun qaçırmaq

**skull** [skʌl] *n* 1. kəllə; *He fell off his bike and fractured his skull O, velosipedindən yıxıldı və kəlləsini zədələdi*; 2. *d.d.* baş; *It has at last been hammered into their skulls Nəhayət bu onların başına yeridilib*;

◊ **empty ~** boş baş

**skull-cap** [ˈskʌlkæp] *n* araqçın, təsək; gecəpapağı

**skunk** [skʌŋk] *n* 1. *zool.* porsuq *(çox pis iy verən heyvan)*; 2. porsuq xəzi; 3. *d.d.* alçaq, əclaf, yaramaz *(adam)*

**sky** [skaı] *n* səma, göy; **a clear blue ~** aydın mavi səma; **sunny/cloudy/grey skies** günəşli/buludlu/boz səma; **to look up at the ~** göyə/səmaya baxmaq; **a starry ~** ulduzlu səma; *The sky turned dark as the storm came near Tufan yaxınlaşdıqca göy qaraldı*;



◊ **under the open ~** açıq havada; **to praise to the skies** tərifləyib göylərə qaldırmaq

**sky-blue[1]** [ˈskaıˈblu:] *n* göy/mavi/lacivərdi rəng

**sky-blue[2]** [ˈskaıˈblu:] *adj* mavi, lacivərdi, göy rəngdə

**sky-high** [ˈskaıˈhaı] *adj* çox hündür, göyə çatan, göy hündürlükdə

**skylark** [ˈskaıla:k] *n zool.* torağay

**skylight** [ˈskaılaıt] *n* baca, bacadan düşən işıq

**skyline** [ˈskaılaın] *n* 1. üfüqdə görünən xətt; 2. ümumi şəkil/təsəvvür *(səmada)*; 3. binanın konturu/çevrəsi

**skyscraper** [ˈskaıskreıpəʳ] *n* göydələn, çox uca/hündür ev, çoxmərtəbəli ev

**skyward[1]** [ˈskaıwəd] *adj* göyə/səmaya yüksələn, göyə/ səmaya istiqamətlənən

**skyward[2]** [ˈskaıwəd] *adv* göyə/səmaya; yuxarıya/ yüksəklərə/göylərə/səmalara doğru; **to look ~** göyə/ səmaya doğru baxmaq

**skywards** [ˈskaıwədz] *adv* = **skyward[2]**

**slab[1]** [slæb] *n* 1. parça, tikə; **a ~ of cake/of meat/of cheese** bir parça pirojna/ət/pendir; 2. plitka; **a ~ of chocolate** bir plitka şokolad; 3. sal, tava/yastı daş; lövhə; **a ~ of a marble/concrete** mərmər/sement lövhə; **paved with stone ~s** daş lövhələrlə döşənmiş; 4. *tik.* şalban yanı *(tirin yanından uzununa kəsilmiş bir tərəfi dəyirmi taxta)*

**slab[2]** [slæb] *v* 1. yastı daşla/tava ilə döşəmək; 2. şalban yanı kəsmək

**slack[1]** [slæk] *n* 1. boş/pis çəkilmiş yer; sallaq yer; **to pull in/up the ~** boş/sallaq yeri dartmaq *(ipdə, çadırda və s.)*; 2. durğunluq *(işdə və s.)*; 3. *dən.* qabarma-çəkilmə arasında olan vəziyyət

**slack[2]** [slæk] *adj* 1. yavaş, ağır, asta; **~ pace /speed** yavaş addım/sürət; 2. zəif; **~ heat/wind** zəif/isti külək; **~ discipline** zəif intizam/nizam-intizam; 3. süst, ətalətli, ləng, ölüvay; **~ trade** ləng ticarət; 4. səliqəsiz, tənbəl, başısoyuq, işə can yandırmayan, fərsiz; **a ~ workman** tənbəl/başısoyuq işçi; 5. boş, yaxşı çəkilməmiş; **a ~ belt** pis çəkilmiş/dartılmış toqqa; **a ~ screw** bərkidilməmiş/boş qayka; 6. tələbkar olmayan, qeyri-ciddi; **~ parents** tələbkar olmayan valideynlər; 7. yumşaq; **~ hands** yumşaq əllər

**slack[3]** [slæk] *v* 1. boşaltmaq, buraxmaq; **to ~ a rope/a girth** kəndiri/tapqırı boşaltmaq; 2. boşalmaq; *The rope/The girth slacked Kəndir /Tapqır boşaldı*; 3. azaltmaq, zəiflətmək *(həm də* **to ~ off**); **to ~ *one's* efforts** səylərini zəiflətmək; 4. zəifləmək, azalmaq; *The rain /The storm slacked Yağış/Tufan zəiflədi/yavaşıdı*; 5. *d.d.* tənbəllik etmək, avara gəzmək; 6. zəif getmək *(iş, ticarət haq.)*

**slacken** [ˈslækən] *v* 1. yavaşıtmaq, sürətini azaltmaq; **to ~ the current/the speed/the step** axını/ sürəti/ addımı yavaşıtmaq; 2. yavaşımaq, azalmaq, zəifləmək; *The current slackened Axın yavaşıdı; The speed slackened Sürət zəiflədi/azaldı; Heat slackened İsti azaldı/ zəiflədi*; 3. azaltmaq, zəiflətmək; **to ~ *one's* efforts** səylərini azaltmaq/zəiflətmək; 4. pis getmək *(iş, ticarət və s. haq.)*; *The demand slackened Tələb aşağı düşdü/azaldı*; 5. boşaltmaq, buraxmaq *(həm də* **to ~ off/away**) **to ~ the reins** cilovu boşaltmaq/buraxmaq *(həm də mac.)*; **to ~ the girth** tapqırı boşaltmaq; 6. yumşaltmaq; **to ~ laws/a person** qanunları/adamı yumşaltmaq; 7. dincəlmək; istirahət vermək; **to ~ *one's* cares** qayğılarından azad olmaq

**slacker** [ˈslækəʳ] *n d.d.* tənbəl, veyl, avara *(adam)*

**slake** [ˈsleık] *v* 1. söndürmək, yatırtmaq *(susuzluğu)*; 2. təmin etmək, yerinə yetirmək; kütləşdirmək *(istəyi, arzunu və s.)*; 3. zəiflətmək *(səyi)*; 4. sönmək, zəifləmək *(alov və s.)*

**slam[1]** [slæm] *n* 1. vurma; çırpma; şarpıldatma; **to close a book/a door/a window with a ~** kitabı/ qapını/ pəncərəni şarpıltı ilə örtmək; 2. güclü zərbə; 3. *amer. d.d.* ciddi/kəskin tənqid

**slam[2]** [slæm] *v* (**-mm-**) 1. çırpmaq, şarpıltı ilə örtmək *(qapını və s.)*; **to ~ the window/the door** pəncərəni/ qapını şarpıltı ilə örtmək; **to ~ the door in the face of *smb.*** qapını bir kəsin üzünə şarpıltı ilə örtmək; 2. çırpılmaq, şarpıltı ilə örtülmək; *The gates always slam (to) Darvazalar həmişə şarpıltı ilə örtülür*; 3. şarpıltı ilə tullamaq/tolazlamaq *(həm də* **to ~ down**); **to ~ *smth.* (down) on the table** bir şeyi şarpıltı ilə stolun üstünə tullamaq/tolazlamaq; 4. vurmaq, döymək; *He got badly slammed about the head Onun başına bərk vurdular*; 5. *amer. d.d.* kəskin surətdə tənqid etmək

**slander[1]** [ˈsla:ndəʳ] *n* böhtan, iftira, şər

**slander[2]** [ˈsla:ndəʳ] *v* böhtan/şər atmaq, iftira etmək/söyləmək

**slanderer** [ˈsla:ndərəʳ] *n* böhtançı, iftiraçı, şər atan adam

**slanderous** [ˈsla:ndərəs] *adj* 1. böhtanlı, böhtanla dolu, iftiralı; **a ~ accusation** böhtanlı ittiham; 2. təhqiredici, təhqirli, təhqiranə, təhqiramiz; **~ expressions/words** təhqiredici ifadələr/sözlər; 3. böhtançı, iftiraçı; şər atan; **a ~ person** böhtançı/ iftiraçı/şər atan adam

**slang[1]** [slæŋ] *n* *(qısa forması* **sl**) jarqon, slənq

**slang[2]** [slæŋ] *adj* jarqon, slənq; **~ words/expressions** jarqon sözlər/ifadələr

**slang[3]** [slæŋ] *v* 1. jarqonda danışmaq; 2. söyüşmək, deyişmək; *These two drivers were slanging each other in the middle of the road Bu iki sürücü yolun ortasında söyüşürdülər/deyişirdilər*

**slangy** [ˈslæŋı] *adj* 1. jarqon işlədən; 2. jarqona aid; 3. diqqəti cəlb edən, gözəçarpan; ədəbsiz, şit *(paltar haq.)*

**slant[1]** [sla:nt] *n* 1. çəplik *(gözdə)*, çaşlıq, çəpgözlük; **on the/a ~** çəp, çəpəki; çəpinə, köndə-

lən, qıyqac; 2. eniş, yamac, dağın döşü; 3. çəpəki şüa; 4. *amer. d.d.* baxış, nöqteyi-nəzər, münasibət, yanaşma; **a ~ on the question/on the situation** məsələyə/vəziyyətə münasibət/yanaşma; 5. *amer. d.d.* ötəri nəzər/baxış; **to take a ~** ötəri baxmaq/nəzər salmaq;

◊ **a ~ of wind** arxadan əsən/münasib külək

**slant²** [sla:nt] *v* 1. əymək, meylləndirmək; əyilmək, meyllənmək; **to ~ one's handwriting from left to right** xəttini soldan sağa əymək /meylləndirmək; *His handwriting slants from left to right Onun xətti soldan sağa meyllənir/əyilir;* 2. əyri/çəpinə düşmək *(işıq haq.)*; 3. qeyri-obyektiv təqdim etmək *(dəlilləri)*; **to ~ the news** xəbəri qərəzli/birtərəfli işıqlandırmaq *(qəzetdə)*; 4. çəpinə/çəpəki dəymək *(güllə haq.)*

**slanting** [´sla:ntıŋ] *adj* çəp, çəpəki, çaş; əyri, qıyqac; **~ eyes** çəp/çaş gözlər; **~ rain** çəpəki yağış; **~ wind** çəpəki külək

**slap¹** [slæp] *n* 1. şapalaq; **to give a ~** şapalaq vurmaq; *The girl gave him a slap across the face Qız onun üzünə bir şapalaq vurdu;* **a ~ in the face** sillə, şillə; 2. təhqir, həqarət, mənəvi zərbə; 3. *d.d.* cəhd; **to have/to take a ~ at smth.** bir şey etməyə cəhd göstərmək

**slap²** [slæp] *v* (-pp-) 1. şapalaqlamaq, şapalaq vurmaq; **to ~ a naughty child** dəcəl uşağı şapalaqlamaq; **to ~ smb. in the face/on the cheek** bir kəsin üzünə şapalaq vurmaq; **to ~ smb. on the back** 1) bir kəsin kürəyinə şapalaq vurmaq; 2) *məc.* bir kəsi təbrik etmək; 2. bərk çırpmaq/vurmaq; **to ~ a door** qapını çırpmaq; **to ~ hands (together)** əlini əlinə vurmaq, əllərini bir-birinə vurmaq; 3. ciddiyyətlə/qüvvətli surətdə tullamaq; **to ~ a parcel/money (down) on the table** bağlamanı/pulu zərbə ilə stolun üstünə tullamaq/atmaq; 4. boğuq səslə çırpılmaq/dəymək; *Waves slap against/on the coast Dalğalar boğuq səslə sahilə çırpıldı;* 5. endirmək, gözünün üstünə basmaq *(papağı)*; **to ~ a hat on one's head** papağını gözünün üstünə basmaq;

◊ **to ~ smb.'s wrist** bir kəsi danlamaq/qınamaq, bir kəsə məzəmmət etmək

**slap³** [slæp] *adv (həm də* **slap-bang***)* 1. birdən, gözlənilmədən, qəfildən; **to finish smth. ~ (off)** bir şeyi qəfildən/gözlənilmədən qurtarmaq; 2. düz; **to hit smb. ~ into the eye** bir kəsin düz gözündən vurmaq; **to be ~ on time** düz vaxtında olmaq

**slapdash¹** [´slæpdæʃ] *n d.d.* 1. səliqəsizlik, diqqətsizlik, pintilik; 2. səliqəsiz/tələsik görülmüş iş, xaltura *(başdansovma iş)*

**slapdash²** [´slæpdæʃ] *adj d.d.* səliqəsiz, diqqətsiz; **~ work** səliqəsiz iş; **a ~ worker** səliqəsiz fəhlə

**slapdash³** [´slæpdæʃ] *adv d.d.* 1. cəld, iti, ildırım kimi, çox sürətlə, şiddətlə; 2. bir təhər, necə gəldi, başdansovdu

**slapping** [´slæpıŋ] *adj d.d.* 1. çox tələsik/iti/cəld; başgicəlləndirici, başgicəldən; **at a ~ pace** başgicəlləndirici sürətlə; 2. çox böyük/yekə/iri, nəhəng, zorba, güclü, qüvvətli

**slap-up** [´slæpʌp] *adj d.d.* çox qəşəng/gözəl; **~ dinner** çox gözəl nahar

**slash¹** [slæʃ] *n* 1. bərk/sərt/şiddətli zərbə *(qamçı və s. ilə)*; 2. dərin yara/çapıq/kəsik; **a ~ from a whip** qamçıdan qalmış yara yeri, qamçı/şallaq yeri; 3. qırma, kəsmə *(meşəni)*

**slash²** [slæʃ] *v* 1. şallaqlamaq, qamçılamaq, qamçı ilə/şallaqla vurmaq; 2. *məc.* amansızcasına/kəskin surətdə təhqir etmək, ifşa etmək, paxırını açmaq; **to ~ at smb.** bir kəsi ciddi tənqid etmək; 3. kəsmək, dərin yara vurmaq; **to ~ smb. with a knife** bir kəsə bıçaqla dərin yara vurmaq; 4. kəsib doğramaq, doğramaq; **to ~ smth. to pieces** bir şeyi parça-parça doğramaq; 5. şaqqıldatmaq *(qamçını)*; 6. kəskin surətdə azaltmaq; **to ~ a budget** büdcəni kəskin surətdə azaltmaq

**slashing¹** [´slæʃıŋ] *n* 1. yaralama, yara vurma; 2. yığın, qalaq *(meşədə)*

**slashing²** [´slæʃıŋ] *adj* 1. sərt, şiddətli, amansız, rəhmsiz; kəskin; **~ criticism** amansız/şiddətli/kəskin tənqid; **to make a ~ criticism of smb.** bir kəsi amansız/kəskin tənqid etmək; 2. çox iti/sürətli/cəld; sarsıdıcı, dağıdıcı; möhvedici; **~ attack** sarsıdıcı hücum; 3. qoçaq, zirək, diribaş; **a ~ fellow** diribaş/zirək oğlan, dəliqanlı; 4. əla, çox yaxşı; **~ dinner** əla/çox yaxşı nahar

**slashing³** [´slæʃıŋ] *adv* çox, olduqca, qeyri-adi

**slat** [slæt] *n* 1. planka, tamasa *(ensiz hamar lövhə)*; köndələn tir; 2. daş lövhə, yastı daş; plitə

**slate¹** [sleıt] *n* 1. *tik.* şifer, şist; 2. proqram *(yarış və s. haq.)*

**slate²** [sleıt] *v* I 1. *tik.* şiferlə örtmək; **to ~ a roof** damı şiferlə örtmək; 2. *amer.* namizədlərin siyahısına daxil etmək *(seçkilərdə)*; *He is slated for governor O, qubernator vəzifəsinə seçilmək üçün siyahıya daxil edilib*

**slate** [sleıt] *v* II 1. *d.d.* bərk danlamaq/qulaqburması vermək; **to ~ a pupil** şagirdi bərk danlamaq; 2. şiddətli/kəskin tənqid etmək, bərk pisləmək; **to ~ an author/a book** müəllifi/kitabı bərk pisləmək/kəskin tənqid etmək

**slate-nail** [´sleıtneıl] *n* şifer mismarı

**slattern** [´slætən] *n* pinti, natəmiz; səliqəsiz *(adət. qadın haq.)*

**slatternly** [´slætənlı] *adj* pinti, səliqəsiz; **a ~ girl** pinti/səliqəsiz qız

**slaughter¹** [´slɔ:tə<sup>r</sup>] *n* 1. kəsmə, kəsilmə *(heyvan haq.)*; **for ~** kəsmə/kəsilmə üçün; 2. qırğın, qətl *(kütləvi surətdə)*; **~ of civilian population** mülki əhalinin kütləvi surətdə qırğını; **fratricidal ~** qardaş qırğını

**slaughter²** [´slɔ:tə<sup>r</sup>] *v* 1. kəsmək *(heyvanı)*; 2. qırğın törətmək, kütləvi surətdə qırmaq; *Men, women and children were slaughtered and villages destroyed Kişiləri, qadınları, uşaqları*



*qırdılar və kəndlər dağıdıldı;* 3. məğlub etmək *(oyunda)*; *We were absolutely slaughtered by the home team Meydança sahibləri bizi tamamilə darmadağın etdilər*

**slaughterer** [´slɔ:tərə<sup>r</sup>] *n* 1. qəssab *(sallaqxanada)*; 2. qırğın törədən, qırğında iştirak edən, cəllad

**slaughter-house** [´slɔ:təhaus] *n* 1. sallaqxana; 2. *məc.* kütləvi qırğın törədilən yer

**Slav¹** [sla:v] *n* slavyan; **the ~s** *top. i* slavyanlar

**Slav²** [sla:v] *adj* slavyan

**Slavdom** [´sla:vdəm] *n* slavyanlıq, slavyanlar, slavyan xalqları

**slave¹** [sleıv] *n* 1. qul, kölə; **to treat smb. like a ~** bir kəslə qul/kölə kimi rəftar etmək; 2. *məc.* qurban, qul; **to be a ~ of habit/of one's passions** vərdişinin/ehtiraslarının qulu olmaq; **to be a ~ of fashion** modanın/dəbin qulu olmaq; **to be a ~ of alcohol** spirtli içkilərin qurbanı/qulu olmaq; 3. zəhmətkeş, çalışqan/işlək adam

**slave²** [sleıv] *adj* qul, kölə; **~ owners** qul/kölə sahibləri; **~ labour** qul/kölə əməyi

**slave³** [sleıv] *v* 1. qul /kölə kimi işləmək, taqətdən /əldən düşənə qədər işləmək; 2. qul etmək, kölə halına salmaq, əsarət altına almaq; 3. qul/kölə kimi rəftar etmək, incitmək, istədiyi kimi rəftar etmək

**slavedom** [´sleıvdəm] *n* köləlik, qulluq, əsarət

**slave-driver** [´sleıv.draıvə<sup>r</sup>] *n* 1. nəzarətçi, gözətçi *(qullar üzərində)*; 2. *məc.* qəddar/zalım rəis, istismarçı

**slave-holder** [´sleıv.houldə<sup>r</sup>] *n* qul/kölə sahibi, quldar

**slavelike** [´sleıvlaık] *adj* qul/kölə kimi, qorxaq, cəsarətsiz

**slaver¹** [´sleıvə<sup>r</sup>] *n* I 1. qul/kölə alverçisi; 2. qul/kölə alveri ilə məşğul olan gəmi

**slaver** [´sleıvə<sup>r</sup>] *n* II 1. ağız suyu, tüpürcək, selik; 2. cəfəngiyyat, boş/mənasız danışıq; 3. açıq-aydın yaltaqlıq

**slaver²** [´sleıvə<sup>r</sup>] *v* 1. selik axıtmaq; 2. tüpürcəkləmək, seliyə/tüpürcəyə bulamaq, yaş etmək *(ağız suyu ilə)*; **to ~ smb.'s cheek** bir kəsin yanağını tüpürcəyə/seliyə bulamaq *(öpərkən)*

**slave-market** [´sleıv.ma:kıt] *n* qul/kölə bazarı

**slavery** [´sleıvərı] *n* 1. quldarlıq, köləlik; qul/kölə sahibliyi, köləlik/quldarlıq quruluşu; 2. ağır məcburi əmək; 3. yaltaqlıq, alçalma

**slave-trade** [´sleıvtreıd] *n* qul/kölə alveri, qul alıb-satma

**Slavic** [´sla:vık] *n* slavyan dil qrupu, slavyan dilləri

**slavish** [´sleıvıʃ] *adj* 1. yaltaq, qul kimi müti; **~ devotion/obedience** qul kimi sadiqlik/itaət; **a ~ yes-man** yaltaq, yarınmağa çalışan, təqlidçi, qeyri-sərbəst adam; **~ translation** hərfi/qeyri-sərbəst tərcümə

**slavishly** [´sleıvıʃlı] *adv* yaltaqcasına, mütiliklə, qul kimi; **to follow the rules ~** qaydalara mütiliklə/qul kimi riayət etmək

**slavonic** [slə´vɔnık] *adj* = **Slavic**

**slay** [sleı] *v (pt* **slew** [slu:]; *pp* **slain** [sleın]) 1. öldürmək; 2. həlak etmək; 3. boğmaq, yatırmaq, sarsıtmaq *(hissi)*

**sleaziness** [´sli:zınıs] *n* pintilik, səliqəsizlik, çirklilik

**sleazy** [´sli:zı] *adj* (-ier, -iest) pinti, çirkli, səliqəsiz; **a ~ club/hotel** səliqəsiz klub/ mehmanxana

**sledge¹** [sledʒ] *n* kirşə, xizək

**sledge²** [sledʒ] *v* kirşə/xizək sürmək

**sledge-hammer** [´sledʒ.hæmə<sup>r</sup>] *n* gürz, ağır çəkic, dəmirçi çəkici

**sleek¹** [sli:k] *adj* (-er, -est) 1. parıldayan, *(saç, xəz haq.)*; **~ hair/fur** parıldayan saç/xəz; 2. hamar, parlaq, cilalı; **a ~ car** parlaq/cilalı maşın; 3. zərif, qəşəng; **a body ~ with health** zərif/qəşəng sağlam bədən; 4. ikiüzlü, riyakar, yaltaq, hiyləgər, qılıqlı, qılığagirən; 5. sakit *(dəniz haq.)*

**sleek²** [sli:k] *v* 1. sığallamaq, sığal vermək, parıldatmaq, cilalamaq, pardaqlamaq; *He sleeked back his hair with water before going in to meet the girl O, qızla görüşə getməzdən əvvəl su ilə saçına sığal verdi/saçını sığalladı;* 2. hamarlamaq, qırışları açmaq/düzəltmək; ütüləmək; 3. ruhən sakitləşdirmək; **to ~ smb.'s ruffled peace of mind** bir kəsi ruhən sakitləşdirmək/rahatlaşdırmaq

**slee-stone** [´sli:kstoun] *n* cilalayıcı/pardaqlayıcı daş

**sleep¹** [sli:p] *n* 1. yuxu; **sound ~** bərk yuxu; **deep ~** dərin yuxu; **light ~** yüngül yuxu; **beauty ~** gözəllik yuxusu *(gecə yarısına qədər olan yuxu)*; **broken ~** səksəkəli yuxu; **a ~ of five hours** beşsaatlıq yuxu; **to go to ~** yuxuya getmək; **to have a good ~** yaxşıca yatmaq; **to get some/a ~** yuxulamaq, yatmaq *(bir az)*, mürgüləmək; **not to get enough ~** lazımi qədər yatmamaq; *I didn't get much sleep last night Mən keçən gecə kifayət qədər yatmadım; I can't get to sleep Mən yata/yuxuya gedə bilmirəm; Some people talk in their sleep Bəzi adamlar yuxuda danışır; Go to sleep now – it's late Gecdir, get/gedin yat/yatın;* 2. *fiziol.* yuxu, qış/yay yuxusu *(heyvanlarda)*; **winter ~** qış yuxusu; 3. keyləşmə, keyimə; *His leg has gone to sleep Onun ayağı keyləşib;*

◊ **the last ~** ölüm; **the never ending ~** əbədi yuxu, ölüm

**sleep²** [sli:p] *v (pt, pp* **slept** [slept]) 1. yatmaq; **to ~ easily** sakit yatmaq; **to ~ a peaceful sleep** rahat yatmaq; **to ~ like a log** daş kimi yatmaq; **to ~ the clock round** on iki saat yatmaq; **to ~ with one eye open** bir gözü açıq yatmaq; *I didn't sleep well last night Mən keçən gecə yaxşı yatmadım; I couldn't sleep because of the noise Mən səsə görə yata bilmədim;* 2. gecələmək; *I shall sleep at my uncle's tonight Mən bu gecə dayımgildə gecələyəcəm;* 3. keyləşmək, keyimək *(əl-ayaq haq.)*; 4. *d.d.* başbirliyi etmək, yaşamaq, cinsi əlaqədə olmaq; **to ~ round** əxlaq-

sızlıq etmək, pozğun həyat keçirmək; kimlə gəldi yaşamaq/cinsi əlaqədə olmaq; **to ~ away** yuxuya qalmaq, yatıb qalmaq;

◊ **to ~ in/on the bed one has made** ≅ əkdiyini biçmək; **to ~ on a volcano** ≅ barıt çəlləyi üstündə oturmaq/yatmaq

**sleeper** ['sli:pəʳ] *n* 1. yuxucul/yatağan adam, yatmağı çox sevən adam; 2. yataq yeri olan vaqon; 3. *d.y.* şpal *(dəmir yol relslərinin altına düzülən ağac və ya metal tir)*; 4. *zool.* süleysin *(dələyə oxşar heyvan)*; 5. qış/yay yuxusuna gedən heyvan

**sleepful** ['sli:pfl] *adj* 1. sakit, dinc, rahat, arxayın; **to spend a ~ night** sakit/rahat bir gecə keçirmək; 2. yuxulu

**sleepiness** ['sli:pınıs] *n* yuxuculluq, kəsalət, daim mürgüləmə

**sleeping** ['sli:pıŋ] *adj* yatan; **a ~ baby** yatan uşaq/körpə; **Sleeping Beauty** Yatan gözəl

**sleeping-car** ['sli:pıŋka:ʳ] *n* yataqlı vaqon

**sleeping-draught** ['sli:pıŋdra:ft] *n* yuxu dərmanı

**sleeping-pills** ['sli:pıŋpılz] *n* yuxugətirən/yuxugətirici həblər

**sleepless** ['sli:plıs] *adj* 1. yuxusuz; 2. ayıq, ayıqsayıq; 3. yorulmaz; usanmaz; **~ activity** yorulmaq bilməyən fəaliyyət

**sleeplessness** ['sli:plısnıs] *n* yuxusuzluq

**sleep-walker** ['sli:p.wɔ:kəʳ] *n* lunatik, somnambul *(yuxuda durub gəzən adam)*

**sleepy** ['sli:pı] *adj* (-ier, -iest) 1. yuxulu; **~ look** yuxulu görkəm/baxış; 2. yatmış, yatan; **a ~ town/village** yatmış şəhər/kənd; **to be ~** yatmaq istəmək; *She is sleepy O yatmaq istəyir, Onun yuxusu gəlir*; 3. durğun, zəif; **~ trade** durğun ticarət

**sleet**[1] [sli:t] *n* sulu qar

**sleet**[2] [sli:t] *v* sulu qar yağmaq; *It's sleeting Sulu qar yağır*

**sleeve** [sli:v] *n* qol; **a dress with short/long ~s** gödəkqollu /uzunqollu paltar; **to turn/to roll up** ***one's*** **~s** qollarını çırmalamaq/qatlamaq; *He rolled up his sleeves and washed his hands O, qollarını çırmaladı və əllərini yudu;*

◊ **to wear** ***one's*** **heart on** ***one's*** **~** hisslərini gizlədə bilməmək

**sleeved** [sli:vd] *adj* 1. qollu, qolu olan; 2. mürəkkəb sifətlərin komponenti; **long-~** uzunqol/uzunqollu; **short-~** qısaqol/qısaqollulu; **a short-~ shirt** qısaqol/qısaqollu köynək

**sleeveless** ['sli:vlıs] *adj* qolsuz; **a ~ dress** qolsuz paltar; **a ~ sweater** qolsuz sviter

**sleeve-link** ['sli:vlıŋk] *n* zaponka *(kişi köynəyinin qollarına, yaxalığına taxılan taxma düymə)*

**sleigh**[1] [sleı] *n* xizək, kirşə *(xüs. ata qoşulan)*

**sleigh**[2] [sleı] *v* xizəkdə/kirşədə gəzmək, xizəklə/kirşə ilə getmək

**sleight** [slaıt] *n* 1. zirəklik, cəldlik, çeviklik, məharət, ustalıq; **~ of hand** əlin çevikliyi/məharəti; 2. biclik, hiyləgərlik, hiylə, fənd; 3. *arx.* fokus, oyun, tryuk

**slender** ['slendəʳ] *adj* (-er, -est) 1. zərif, incə, qəşəng, gözəl; qamətli, qədd-qamətli; **a ~ young girl** zərif/gözəl/incə gənc qız; **a ~ waist** zərif/incə bel; **~ fingers** zərif/incə barmaqlar; 2. az, zəif, cüzi, kiçik, balaca, xırda; **a ~ book** balaca/kiçik kitab; **~ knowledge** cüzi/azca bilik; **~ resources** azca/cüzi ehtiyatlar; **~ hopes** kiçik/cüzi/zəif ümidlər; **a ~ majority** cüzi/azca üstünlük; **to win by a ~ majority** azca/cüzi üstünlüklə udmaq/qalib gəlmək;

◊ **~ purse** kasıblıq, pulsuzluq

**slenderize, -ise** ['slendəraız] *v* 1. arıqlamaq, zərifləşmək, incələşmək; 2. arıqlatmaq, zərifləşdirmək, incələşdirmək

**slenderly** ['slendəlı] *adv* zərif, incə, gözəl, qəşəng, nazik, incəliklə; ustalıqla, məharətlə

**slenderness** ['slendənıs] *n* zəriflik, incəlik, qəşənglik, gözəllik

**slept** [slept] **to sleep** *felinin pt., pp formaları*

**sleuth**[1] [slu:θ] *n* 1. axtarıcı it; 2. *d.d.* xəfiyyə; **an amateur ~** həvəskar xəfiyyə

**sleuth**[2] [slu:θ] *v* 1. izlə getmək; izləmək, güdmək, izləyib tapmaq; 2. xəfiyyəlik etmək

**slew**[1] [slu:] **to slay** *felinin pt forması*

**slew**[2] [slu:] *n* I *amer. d.d.* çoxlu, külli miqdar, hədsiz, hədsiz-hesabsız, saysız-hesabsız; *He had slews of work Onun çoxlu/hədsiz-hesabsız işi var idi*

**slew** [slu:] *n* II çevirmə, çevrilmə; dönmə, döndərmə; döngə; dönüş

**slew**[3] [slu:] *v* 1. cəld döndərmək/çevirmək; 2. dönmək, çevrilmək; fırlanmaq; *The car slewed from side to side on the icy road Maşın buzlu yolda o yan bu yana çevrildi/fırlandı*

**slice**[1] [slaıs] *n* 1. parça, tikə; qırıq; dilim; **a ~ of bread/of cake/of meat/of cheese** bir parça çörək/ pirojna/ət/pendir; **a ~ of lemon** bir dilim limon; 2. hissə, pay; **a ~ of the profits/of the winnings** gəlirin/uduşun bir hissəsi; 3. çalov, xəkəndaz *(buxarı üçün)*; 4. kürək, bel

**slice**[2] [slaıs] *v* 1. dilimləmək, dilim-dilim/parça-parça kəsmək; **to ~ (up) the meat** əti parça-parça kəsmək; **to ~ cucumber/melon/ watermelon** xiyarı/yemişi/qarpızı dilimləmək/dilim-dilim kəsmək; 2. yarmaq *(havanı)*; 3. *id.* kəsmək *(topu)*; **to ~ off** kəsmək; **to ~ up** kəsmək, doğramaq

**slick**[1] [slık] *n amer.* tabaşirli kağızda çap olunan şəkilli populyar jurnal

**slick**[2] [slık] *adj* (-er, -est) 1. hamar və parlayan; tumarlanmış *(saç haq.)*; **~ hair** tumarlanmış saç; 2. sürüşkən; *The roads were slick with wet mud Yollar sıyıq palçıqdan sürüşkən idi*; 3. bic; diribaş, cəld, zirək, çevik; bacarıqlı, mahir; fəndgir; *She's very slick, but I don't believe a word she says O çox bacarıqlıdır, lakin mən onun dediyi bir sözə də inanmıram*; 4. *amer. jarq.* əla; *The meal was slick Yemək əla idi*; 5. *amer. d.d.* səthi; yüngül; **a ~ book** yüngül kitab *(asan oxunan)*



**slick**[3] [slık] *v* 1. cilalamaq, hamarlamaq; sığallamaq; **to ~** ***one's*** **hair** saçını sığallamaq; 2. *d.d.* bölünmək, parçalanmaq; 3. *amer. d.d.* yığışdırmaq, qaydaya salmaq, bəzəmək; 4. *k.t.* hamarlamaq, malalamaq *(əkilmiş yeri, şumu)*

**slicker** ['slıkəʳ] *n* 1. *amer.* makintoş, sukeçirməyən plaş; 2. *amer. d.d.* bic, hiyləgər, aferist, tülüngü, yalançı; 3. *k.t.* şaxmala *(mala növü)*

**slide**[1] [slaıd] *n* 1. sürüşmə; **to have a ~ on the ice** buz üzərində sürüşmək; 2. katok *(konkidə sürüşmək üçün buz meydançası)*; *Let's go for a slide on the frozen pond Gəl/Gəlin donmuş gölməçə üzərində sürüşməyə gedək*; 3. qoşma; sıxac, qısqac; 4. *fot.* slayd, diapozitiv *(proyeksiya fənəri vasitəsilə göstərilmək üçün şüşə və s. üzərinə salınan şəkil)*; 5. *fot.* kaset *(fotoplastinkaları saxlamaq üçün işıq keçirməyən qutu)*

**slide**[2] [slaıd] *v* *(pt, pp* **slid** [slıd]) 1. sürüşmək, sürüşüb düşmək; **to ~ on the ice** buz üzərində sürüşmək; *The children were sliding on the ice Uşaqlar buz üzərində sürüşürdülər; The book slid off my knee Kitab sürüşüb dizimin üstündən düşdü; The bottle slid from his hand Butulka sürüşüb onun əlindən düşdü*; 2. sürüşüb aradan çıxmaq, oğrunca getmək; *He slid into the room O oğrunca otağa girdi*; **to ~ past** ***smb.*** bir kəsin yanından xəlvəti keçmək; 3. tədricən bir vəziyyətə düşmək; **to ~ into a bad habit** pis adət qazanmaq *(tədricən)*; **to ~ into sin** günaha batmaq; **to ~ away** aradan çıxmaq, yox olmaq; **to ~ down** sürüşüb aşağı düşmək;

◊ **to let things ~** bir şeyə məsuliyyətsiz yanaşmaq, bir şeyi nəzərdən qaçırmaq/əldən buraxmaq

**sliding** ['slaıdıŋ] *adj* siyirtmə; **a ~ door** siyirtmə qapı

**slight**[1] [slaıt] *n* etinasızlıq, saymazlıq, saygısızlıq, laqeydlik, hörmətsizlik, ehtiramsızlıq, saymama; **to put a ~ on/upon** ***smb.*** bir kəsə etinasızlıq/hörmətsizlik göstərmək, bir kəsi saymamaq

**slight**[2] [slaıt] *adj* (-er, -est) 1. arıq, zərif, incə; **a ~ girl** zərif/incə qız; **a ~ girlish figure** zərif/incə qız əndamı; 2. zəif; **~ foundation** zəif özül/bünövrə; 3. yüngül, azca; **a ~ cold** bir az/ yüngül soyuqlama; **~ injury** azca zədələnmə; 4. səthi, üzdən; **~ knowledge** səthi bilik

**slight**[3] [slaıt] *v* 1. saymamaq, məhəl qoymamaq, etinasızlıq/hörmətsizlik göstərmək, xor baxmaq; **to ~** ***one's*** **duties/*****one's*** **work** vəzifəsinə/işinə etinasızlıq göstərmək; 2. lağa qoymaq, xor baxmaq

**slightly** ['slaıtlı] *adv* bir az/azca, azacıq; **to touch ~** bir azca/azacıq toxunmaq; **to feel ~ ill** özünü bir az xəstə hiss etmək; *The patient is slightly better today Xəstə bu gün bir az/azca yaxşıdır*

**slightness** ['slaıtnıs] *n* 1. incəlik, zəriflik; arıqlıq; 2. zəifləmə; 3. səthilik; **the ~ of the knowledge** biliyin səthiliyi

**slim**[1] [slım] *adj* (-mmer, -mmest) 1. zərif, incə; boylu, qamətli; boylu-buxunlu, qədd-qamətli; biçimli; **a ~ waist** incə bel; **a ~ person** boylu-buxunlu/qədd-qamətli adam; **a ~ leg** biçimli ayaq; 2. azca, bir az; **a ~ chance of recovery** sağalmağa azca imkan/şans; *Our chance of winning is slim Qalib gəlmək üçün bizim şansımız/imkanımız azcadır*; 3. bic, çevik, zirək, mahir

**slim**[2] [slım] *v* (-mm-) arıqlamaq, arıqlamağa çalışmaq/cəhd etmək; *She's trying to slim O, arıqlamağa çalışır*

**slime**[1] [slaım] *n* 1. lil; xılt, çöküntü; 2. selik; *Snails leave a trail of slime İlbizlər selik izi buraxır/qoyur*

**slime**[2] [slaım] *v* 1. lillənmək, lillə/xıltla örtülmək; 2. seliyə bulanmaq; 3. *amer.* selik axıtmaq /buraxmaq; 4. *d.d.* sürüşüb aradan çıxmaq, qaçmaq, qaçıb getmək

**slimming** ['slımıŋ] *n* arıqlama, incələşmə, zərifləşmə

**slimness** ['slımnıs] *n* incəlik, zəriflik, arıqlıq

**slimy** ['slaımı] *adj* (-ier, -iest) 1. sürüşkən; *The stones were slimy with weed Daşlar yosundan sürüşkən idi*; 2. lilli, lil basmış, xıltlı, xılt basmış; 3. iyrənc, çox pis/iyrənc, rəzil, alçaq; **~ language** iyrənc söyüş; **a ~ traitor** rəzil/alçaq satqın/xain

**sling**[1] [slıŋ] *n* 1. kanat, buraz *(yoğun kəndir)*; 2. *hərb.* silah qayışı; 3. *tib.* sapandaoxşar sarğı *(yaralanmış qolu yuxarıdan asmaq üçün)*; 4. sapand; quşatan; 5. atma, tullama, tolazlama; 6. bir dəfəyə qaldırılan yük

**sling**[2] [slıŋ] *v* *(pt, pp* **slung** [slʌŋ]) 1. *d.d.* atmaq, tolazlamaq, tullamaq; **to ~ a gun over** ***one's*** **shoulder** silahı çiyninə atmaq; **to ~ a knapsack** arxa çantasını belinə atmaq; **to ~ a stone at birds** quşlara daş atmaq/tolazlamaq; *He slung his coat angrily into the car O, paltosunu acıqlı-acıqlı maşının içinə tulladı/atdı*; 2. yüyürmək, çaparaq getmək, bərk qaçmaq; 3. sapand atmaq; 4. asmaq, sallamaq; **to ~ a hammock** qarmaq *(tor yelləncək)* asmaq; **to ~ about** *d.d.* veyl-veyl/avara-avara/boş-bikar gəzmək;

◊ **to ~** ***one's*** **hook** 1) xəlvəti qaçmaq, əkilmək; 2) oğurluq etmək, oğurluqla məşğul olmaq; **to ~ a pot** sərxoşluq/əyyaşlıq etmək

**slink**[1] [slıŋk] *n* I 1. bala salma/atma *(heyvanlar haq.)*; 2. sısqa/cılız/zəif/düşük adam

**slink** [slıŋk] *n* II gizli edilən hərəkət; **a ~ of the eye** oğrun baxış/nəzər

**slink**[2] [slıŋk] *v* I *(pt, pp* **slunk** [slʌŋk]) bala salmaq *(heyvanlarda)*

**slink** [slıŋk] *v* II *(pt, pp* **slunk** [slʌŋk]) xəlvəti yaxınlaşmaq/keçib getmək *(həm də* **to ~ about /by)**

**slinky** ['slıŋkı] *adj* zərif, incə, gözəl, qəşəng; ahəstə; süzgün, yüngül, rəvan; **~ gait** 1) rəvan /yüngül/ahəstə/zərif yeriş; 2) ahəstə addımlar

**slip**[1] [slıp] *n* I *(adət. təkdə işlənir)* 1. sürüşmə;

*One slip and you could fall off the cliff Bir az sürüşsən/sürüşsəniz yıxıla bilərdin/bilərdiniz;* 2. xəta, yanlışlıq, diqqətsizlik, səhv; **a ~ of the pen** yazı xətası; **a ~ of the tongue** yanılma, diqqətsizlik, səhv, xəta *(danışıqda)*; **to make a ~** səhv etmək, yanlışlığa/xətaya yol vermək; 3. lifçik, döşlük, döşqabı; 4. kombinasiya *(qadın alt paltarı)*; 5. uşaq döşlüyü/önlüyü; 6. *pl* üzgüçü tumanı, çimərlikdə geyilən qısa tuman; 7. balışüzü, yastıqüzü;
◊ **to give *smb.* the ~** 1) bir kəsdən qaçınmaq/kənar gəzmək/çəkinmək; 2) bir kəsdən sivişmək/ qaçmaq/yayınmaq

**slip** [slıp] *n* II 1. uzun nazik zolaq; 2. talaşa, yonqar; tilişkə; 3. zoğ, cavan budaq; qələm, çilik, şitil; 4. *şair.* nəsil, övlad, nəvə-nəticə; **a bastard ~** kəbinsiz doğulmuş övlad, bic

**slip**[2] [slıp] *v* (**-pp-**) I 1. sürüşmək; *The girl's foot slipped, and she fell Qızın ayağı sürüşdü və o yıxıldı; He slipped (over) on the ice and broke his leg O, buzun üstündə sürüşdü və ayağını sındırdı; The razor slipped and I cut my chin Ülgüc sürüşdü və mənim çənəmi kəsdi; The fish slipped out of my hand Balıq əlimdən sürüşdü;* 2. sakitcə hərəkət etmək; əkilmək, yayınmaq, sivişmək; *She slipped out of the room O sakitcə sivişib otaqdan çıxdı; He slipped past the door without being seen O, sakitcə qapıdan çıxıb gözə dəymədən əkildi;* 3. əldən buraxmaq/vermək; **to let an opportunity ~** imkanı əldən vermək/buraxmaq; 4. sürüşüb düşmək; *The cup slipped out of her hand Fincan sürüşüb onun əlindən düşdü; The books slipped to the floor Kitablar sürüşüb döşəməyə düşdü;* 5. çıxartmaq; **to ~ *one's* ring off *one's* finger** üzüyünü barmağından çıxartmaq; *The dog slipped his collar İt xaltasını çıxartdı;* 6. xəta/səhv etmək, yanlışlığa yol vermək *(həm də* **to ~ up**); *He rarely slips O, nadir hallarda səhv edir;* 7. *d.d.* zəifləmək, gücünü itirmək; *He has slipped badly since his heart-attack Ürək tutmasından sonra o çox zəifləyib;* 8. aşağı enmək, düşmək; *Prices have slipped during the last year Son ildə qiymətlər aşağı enib/düşüb;* 9. burxutmaq, çıxartmaq; **to ~ *one's* arm** qolunu burxutmaq; *He slipped his shoulder O, çiynini burxutdu;* 10. atmaq, tullamaq; *The snake slipped its skin İlan qabığını/dərisini atdı;* 11. unutmaq, çıxmaq *(yaddan); The appointment slipped (from) my memory Görüş mənim yadımdan çıxdı;* 12. unutmaq, yaddan çıxartmaq; *Her name slipped from my lips Mən onun adını unutdum;* 13. qaçmaq *(zərbədən)*; 14. *k.t.* bala salmaq *(heyvanlar haq.)*; 15. *d.y.* açmaq *(vaqonu)*; **to ~ along** *d.d.* sürətlə/çaparaq getmək, bərk yüyürmək, çapmaq; **to ~ away** 1) aradan çıxmaq, yox olmaq; 2) xudahafizləşmədən getmək; 3) uçmaq *(vaxt haq.)*; **to ~ down** 1) sürüşüb yıxılmaq; 2) soyunmaq *(paltarı)*; **to ~ in** 1) xəlvəti/gözə dəymədən daxil olmaq; 2) soyunmaq, çıxartmaq *(paltarı)*; **to ~ on** geyinmək, atmaq, örtmək *(paltonu çiyinə və s.)*; **to ~ up** səhv/xəta etmək, yanlışlığa yol vermək;
◊ **to ~ money to *smb.*** bir kəsə rüşvət vermək; **to ~ *one's* breath** ölmək

**slip** [slıp] *v* (**-pp-**) II kəsmək *(qələm, çilik)*; **to ~ off** dərmək, qopartmaq; sındırmaq; **to ~ off a flower** çiçək dərmək/qopartmaq; **to ~ off a spring** budaq sındırmaq/qopartmaq

**slip-cover** [ˈslıp.kʌvəʳ] *n* 1. çexol, örtü *(mebel üçün)*; 2. cild üzlüyü *(kitab cildinin üstünə çəkilən qabıq/üz)*

**slip-over** [ˈslıp.ouvəʳ] *n* 1. çexol, futlyar *(qab, qutu)*; 2. cild üzlüyü *(kitabın cildinin üstündən çəkilən əlavə üz)*; 3. sviter, pulover

**slipper** [ˈslıpəʳ] *n* ev ayaqqabısı, evdə geyilən ayaqqabı, çəkələk

**slippery** [ˈslıpərı] *adj* 1. sürüşkən, hamar; **a ~ road/floor** sürüşkən yol/döşəmə; *Ice made the road slippery Buz yolu sürüşkən etdi;* 2. etibarsız, qeyri-müəyyən; aldadıcı, yalançı; **a ~ person** etibarsız adam

**slippy** [ˈslıpı] *adj* = **slippery**

**slipshod** [ˈslıpʃɔd] *adj* pinti geyimli; səliqəsiz; **a ~ way of dressing/of speaking/of writing** səliqəsiz tərzdə geymə/danışma/yazma

**slit**[1] [slıt] *n* 1. yarıq, çatlaq; deşik, kəsik; **the ~ of a letter-box** poçt qutusunun yarığı; **a long ~ in her skirt** onun yubkasında uzun yarıq; 2. dar pəncərə; 3. yarılmış yer

**slit**[2] [slıt] *v* (**-tt-**; *pt, pp* **slit**) 1. uzununa kəsmək; **to ~ open an envelope** zərfi kəsib açmaq; 2. nazik zolaq kəsmək; **to ~ cloth into strips** parçanı ensiz zolaqlara kəsmək; 3. cırılmaq, yırtılmaq; 4. parçalamaq, yarmaq; **to ~ *smb.'s* head** bir kəsin başını yarmaq; 5. daraltmaq, qıymaq; **to ~ *one's* eyes** gözlərini qıymaq *(gözü)*

**slither** [ˈslıðəʳ] *v d.d.* 1. bürünmək, qıvrılmaq, lülə kimi bükülmək; 2. sürüşmək, sürüşüb düşmək/ yıxılmaq/ çıxmaq; 3. sürüşə-sürüşə getmək/yerimək; 4. sürünmək, sürünə-sürünə getmək/yerimək

**slithery** [ˈslıðərı] *adj* 1. sürüşkən, hamar; 2. *məc.* pinti, natəmiz, murdar; çirkli, kirli

**sliver**[1] [ˈslıvəʳ] *n* 1. talaşa, yonqar, tilişkə; qəlpə, qırıntı; qırıq, tikə, parça *(bir şeyin qırılmış hissələri)*; 2. *toxuc.* sap, ip *(yun, pambıq)*; 3. kəsik yarası

**sliver**[2] [ˈslıvəʳ] *v* 1. yarmaq, parçalamaq; kəsmək, doğramaq, bölmək; çapmaq, sındırmaq; 2. yarılmaq, parçalanmaq; kəsilmək, doğranmaq, bölünmək; çapılmaq; 3. *toxuc.* sap/lent düzəltmək

**slob** [slɔb] *n* tənbəl, fərsiz, səhlənkar; küt, korazehin, kütbeyin; bacarıqsız, kobud *(adam)*; *Get out of bed, you fat slob! Çarpayıdan dur/qalx, ay fərsiz!*




**slobber**[1] [ˈslɔbəʳ] *n* 1. selik, tüpürcək, ağız suyu; 2. sentimental boşboğazlıq; 3. aramsız yağan çiskin yağış

**slobber**[2] [ˈslɔbəʳ] *v* 1. selik axıtmaq; tüpürcəkləmək, seliyə bulamaq; *The baby had slobbered all over its bib Körpə önlüyünü başdan-başa seliyə bulayıb;* 2. tökmək; **to ~ water over the floor** döşəməyə su tökmək; 3. necə gəldi/başdansovma işləmək

**slobbery** [ˈslɔbərı] *adj* 1. selikli, ağzının suyu axan, ağzından selik axan; 2. ağlağan; **a ~ child** ağlağan uşaq; 3. pinti, səliqəsiz

**slog**[1] [slɔg] *n* 1. *d.d.* ağır zərbə; 2. çətin, yorucu iş; **to have a ~ on** çox işləmək; *Making the exam papers was quite a slog İmtahan biletlərini hazırlamaq çox çətin və yorucu iş idi*

**slog**[2] [slɔg] *v d.d.* (**-gg-**) 1. döymək, vurmaq; bərk yumruqlamaq, kötəkləmək, əzişdirmək; 2. ağır zərbə endirmək *(boksda)*; 3. *d.d.* çox və inadla işləmək *(həm də* **to ~ away/on**); **to ~ at *one's* work** işinə girişmək; 4. güclə/yavaş-yavaş getmək/yerimək, sürünmək

**slogan** [ˈslougən] *n* şüar, çağırış; **political ~s** siyasi şüarlar; *"Power to the people!" is their political slogan "Hakimiyyət xalqa!" onların siyasi şüarı idi*

**slop**[1] [slɔp] *n* 1. *(adət. pl)* çirkab, çirkli su; **to empty the ~s** çirkabı boşaltmaq; 2. qab suyu *(dadsız duru xörək mənasında)*; 3. duru xörək; **to live on ~s** ancaq duru xörək yemək; ancaq şorba və sıyıqla qidalanmaq *(xəstə haq.)*; 4. gölməçə, çamır, nohur, su yığını; 5. pinti, natəmiz *(adam)*

**slop**[2] [slɔp] *v* (**-pp-**) 1. tökmək; **to ~ tea on the tablecloth** süfrənin üstünə çay tökmək; *He slopped food all down his shirt O, bütün yeməyi köynəyinə tökdü; She slopped the dirty water out onto the grass O, çirkli suyu (göy) otun üstünə tökdü;* 2. tökülmək; *As I put the bucket down, some water slopped out Mən vedrəni yerə qoyanda bir az su töküldü;* **to ~ over** kənarlarından tökülmək

**slope**[1] [sloup] *n* 1. yamac; **a grassy ~** otlu yamac; **to run up/down the ~** yamacı yuxarı/aşağı qaçmaq; 2. eniş, enişlik, maillik; **slight/steep ~** az meylli/sərt eniş

**slope**[2] [sloup] *v* 1. əyilmək, meyllənmək; *The sun was sloping to the west Günəş qərbə meyllənirdi;* 2. əymək, söykəmək, dayamaq, dirəmək; **to ~ a ladder on the wall** nərdivanı divara dirəmək/söykəmək; 3.: **to ~ arms** *hərb.* tüfəngi çiyninə almaq/götürmək

**sloppily** [ˈslɔpılı] *adv* pinti, səliqəsiz; **to dress ~** səliqəsiz geyinmək

**sloppiness** [ˈslɔpınıs] *n* pintilik, səliqəsizlik

**sloppy** [ˈslɔpı] *adj* 1. yaş, nəm; **~ weather** nəm hava; 2. palçıqlı, yaş *(yol və s. haq.)*; 3. bulanmış, çirkləndirilmiş, batmış; 4. sulu, sıyıq *(yemək haq.)*; 5. enli, geniş, boş, böyük *(paltar haq.)*; 6. *d.d.* pinti, səliqəsiz; diqqətsiz, saymaz

**slosh** [slɔʃ] *v* 1. şappıldatmaq, fırçıldatmaq, sıçratmaq *(palçığı, suyu)*; şappıldamaq, fırçıldamaq *(palçıq, su haq.)*; 2. *amer.* veyl-veyl gəzmək /dolanmaq; 3. tökmək, dağıtmaq *(suyu)*; *He sloshes water all over the floor whenever he has a bath O nə vaxt çimsə, bütün döşəməyə su tökür/dağıdır*

**slot**[1] [slɔt] *n* I 1. qanov, xəndək, ensiz arx; 2. yarıq, çat, kəsik, deşik; **to cut a ~ in the box** qutuda deşik açmaq; **to put a coin in the ~** yarığa dəmir pul salmaq/atmaq; 3. lyuk *(teatr səhnəsinin döşəməsində deşik)*

**slot** [slɔt] *n* II maral və s. heyvanların izi

**slot**[2] [slɔt] *v* I 1. açmaq *(deşik, yarıq)*; 2. *tex.* oymaq, deşmək, dəlmək; 3. avtomata dəmir pul/sikkə atmaq

**slot** [slɔt] *v* II izlə/ləpirlə getmək

**sloth** [slouθ] *n* I 1. tənbəllik, avaralıq, veyllik, vaxtını boş keçirmə, bekarçılıq; 2. lənglik, ağırlıq, ləngimə

**sloth** [slouθ] *n zool.* II ərincək *(meymun növü)*

**slothful** [ˈslouθfl] *adj* 1. tənbəl, başısoyuq; fərsiz; 2. ağır, ağırtərpənən, astagəl, ləng, yavaş

**slouch**[1] [slautʃ] *n* 1. bir az beli bükülmə, çiyinləri çıxma, donqarlıq, qozbel; 2. yöndəmsiz/ağır yeriş; 3. *d.d.* tənbəl/pis/bacarıqsız işçi; **to be no ~ at work** işin öhdəsindən babat gəlmək

**slouch**[2] [slautʃ] *v* 1. belini əymək/bükmək/qatlamaq; beli bükülmək; 2. alnına basmaq *(şlyapanı, papağı)*; 3. enmək, sallanmaq; **to ~ about /along** boş-boş/avara-avara gəzmək, veyllənmək

**slough**[1] [slau] *n* I 1. bataqlıq, bataq yeri, çeyillik; 2. depressiya, ruh düşkünlüyü, ruhi sarsıntı

**slough** [slau] *n* II 1. qabıq, dəri, atılmış qabıq *(ilanın)*; 2. qabıq *(meyvədə)*; 3. qabıq, köz, qartmaq *(yarada)*; 4. unudulmuş/tərgidilmiş adət

**slough**[2] [slau] *v* 1. qabığını/dərisini dəyişmək *(ilan haq.)*; 2. tökülmək *(bahar, meyvə, çiçək haq.)*; 3. qartmaqla örtülmək, köz bağlamaq *(yara haq.)*

**sloven** [ˈslʌvn] *n* 1. pinti, natəmiz *(adam)*; 2. səliqəsiz/etinasız işçi; 3. cızma-qaraçı *(pis, dəyərsiz yazıçı və s.)*; xalturaçı

**slovenliness** [ˈslʌvnlınıs] *n* 1. pintilik, natəmizlik; 2. diqqətsizlik, laqeydlik, səliqəsizlik

**slovenly** [ˈslʌvnlı] *adj* 1. pinti, natəmiz, çirkli, kirli; **a ~ waiter** pinti/natəmiz xörəkpaylayan; 2. laqeyd, səliqəsiz, diqqətsiz; **a ~ attitude** laqeyd münasibət

**slow**[1] [slou] *adj* (**-er, -est**) 1. yavaş, asta, ahəstə, ağır; **~ speed** yavaş/asta sürət; **~ music** ahəstə /ağır musiqi; **a ~ train** asta/yavaş gedən qatar; **a ~ walk** asta/ahəstə yeriş; **at a ~ pace/step** asta /yavaş addımla; 2. tələsməyən, ağırtərpənən, ləng; **a ~ reader** ləng oxucu; 3. fərasətsiz, düşüncəsiz, küt, gec başa düşən; **a ~ child** küt /fərasətsiz uşaq; 4. gec/yavaş-yavaş təsir edən,

ləng, yavaş; ~ **poison** gec/yavaş-yavaş təsir edən zəhər; ~ **development/growth** yavaş-yavaş inkişaf/böyümə; 5. zəif; **to cook on a ~ fire** zəif odda bişirmək; 6. uzun, uzunmüddətli; ~ **journey** uzun/uzunmüddətli səyahət; 7. geriqalan *(saat haq.)*; *My watch is five minutes slow Mənim saatım beş dəqiqə geri qalır*; 8. gecikən, qeyri-dəqiq; **to be ~ in keeping an appointment** görüşə gecikmək; *The guests are slow in arriving Qonaqlar gecikirlər*; 9. maraqsız, darıxdırıcı, usandırıcı, ürəksıxan; **a ~ book** maraqsız/darıxdırıcı kitab; ~ **life** maraqsız/usandırıcı/darıxdırıcı həyat; 10. ləng, süst, durğun *(ticarət haq.)*

**slow²** [slou] *v* 1. yavaşıtmaq, sürətini almaq /azaltmaq *(adət.* **to ~ down/off/up)**; *He slowed the car down and then stopped O, maşının sürətini azaltdı və sonra dayandırdı/saxladı*; *You'd better slow down going through the village Kəndin içindən keçərkən yaxşı olardı ki, sürəti azaldaydın/azaldaydınız*; 2. yavaşımaq, sürəti azalmaq; yubanmaq, ləngimək; *Lack of investment will slow (down) our economic growth İnvestisiyanın olmaması bizim iqtisadi inkişafımızı ləngidəcək*

**slow³** [slou] *adv* **(-er, -est)** yavaş, asta; **to walk ~** yavaş yerimək; *Please walk a bit slower Zəhmət olmasa bir az yavaş yeriyin*

**slow-** [slou-] *mürəkkəb sözlərin komponenti:* **slowdown** ləngitmə, tormozlama, dayandırma, ləngimə

**slow-coach** [ˈslouˈkoutʃ] *adj d.d.* ağırtərpənən /astagəl adam, küttəhər/azqanan adam

**slowdown** [ˈsloudaun] *n* tormozlama, saxlama, dayandırma

**slowly** [ˈslouli] *adv* yavaşca, astaca; yavaş-yavaş, asta-asta, ağır-ağır; **to walk ~** yavaş-yavaş/asta-asta yerimək; **to learn ~** yavaş-yavaş öyrənmək; **to go ~** asta-asta/ağır-ağır getmək; **to work ~** yavaş-yavaş/ağır-ağır işləmək; *She slowly opened the door and entered the room O, qapını yavaşca açdı və otağa daxil oldu*; *Slowly, things began to improve İşlər yavaş-yavaş yaxşılaşmağa/düzəlməyə başladı*

**slow-paced** [ˈsloupeist] *adj* 1. yavaş, asta, ağır *(yeriş, hərəkət haq.)*; 2. sonsuz, tükənməz, nəhayətsiz, qurtarmaz, qurtarmaq bilməyən, uzun *(vaxt haq.)*

**slowpoke** [ˈsloupouk] *n amer.* = **slow-coach**

**sludge** [slʌdʒ] *n* 1. palçıq, lil; 2. çöküntü, torta, xılt; 3. piy, iç yağı; 4. tullantılar; **chemical /toxic ~** kimyəvi/zəhərli tullantılar

**slug¹** [slʌg] *n* I *zool.* mişarçı *(cücü)*

**slug** [slʌg] *n* II 1. güllə; 2. külçə, təbii halda tapılan saf mədən; 3. *amer.* jeton *(telefon və s. üçün)*

**slug²** [slʌg] *v* **(-gg-)** *d.d.* bərk vurmaq *(xüs. yumruqla)*

**sluggish** [ˈslʌgiʃ] *adj* 1. tənbəl, ağır; əzgin, süst; **to feel ~ after eating too much** həddindən artıq yedikdən sonra özünü ağır/süst hiss etmək; 2. ağırtərpənən, küt; 3. zəif; **a ~ pulse** zəif nəbz; **a ~ economy** zəif iqtisadiyyat; 4. durğunluq; ~ **period** durğunluq dövrü

**sluggishly** [ˈslʌgiʃli] *adv* əzgin; əzgin bir tərzdə; zəif-zəif, yavaş, asta; **to feel ~** özünü əzgin hiss etmək

**sluggishness** [ˈslʌgiʃnis] *n* 1. tənbəllik, ağırlıq, zəiflik, kütlük; 2. durğunluq, fəaliyyətsizlik

**sluice¹** [slu:s] *n* şlüz *(çayda, kanalda suyu saxlamaq və lazım olduqca buraxmaq üçün mütəhərrik qapı)*

**sluice²** [slu:s] *v* 1. *(həm də* **to ~ out)** suyu şlüzdən buraxmaq ; 2. yumaq *(su ilə)*; *We sluiced the muddy wheels (down) with a hose Biz şlanqla palçıqlı təkərləri yuduq*; 3. axmaq, tökülmək; *Rain was sluicing down Yağış elə bil vedrədən tökülürdü*

**sluice-gate** [ˈslu:sˈgeit] *n* şlüz qapısı

**sluice-way** [ˈslu:sˈwei] *n* şlüz kanalı/arxı

**slum¹** [slʌm] *n* 1. *adət. pl* şəhərin yoxsullar yaşayan hissəsi; xarabalıq; natəmiz künc-bucaq; 2. şəhərin yoxsullar yaşayan hissəsində ev/otaq

**slum²** [slʌm] *v* **(-mm-)** 1. şəhərin yoxsullar yaşayan hissəsinə baş çəkmək/getmək; 2. *d.d.* boş-boş danışmaq, cəfəngiyyat danışmaq

**slumber¹** [ˈslʌmbəʳ] *n* 1. yuxu; **deep/leaden ~** dərin yuxu; **to fall into a deep ~** dərin yuxuya getmək; **to disturb** ***smb.'s*** **~(s)** bir kəsin yuxusuna mane olmaq/haram qatmaq; 2. mürgü

**slumber²** [ˈslʌmbəʳ] *v* 1. *şair.* yatmaq, mürgüləmək *(həm də məc.)*; **to ~ peacefully** rahat yatmaq; 2. *şair.* rahat yatmaq *(qəbirdə)*; **to ~ away** yatıb qalmaq, yatıb yuxuya qalmaq

**slumberous** [ˈslʌmbərəs] *adj* 1. yuxulu, mürgülü; ~ **voice** mürgülü/yuxulu səs; ~ **eyelids** yuxulu göz qapaqları; 2. yuxugətirən, yatıran; ~ **voice** yuxugətirən səs; ~ **atmosphere** yuxugətirən mühit/şərait; 3. sakit, səssiz-səmirsiz; ~ **wood** sakit/səssiz-səmirsiz meşə

**slummy** [ˈslʌmi] *adj* səliqəsiz, çirkli; **a ~ street** sədliqəsiz/çirkli küçə

**slump¹** [slʌmp] *n* I 1. kəskin və ya qəfil enmə /düşmə *(qiymət və s. haq.)*, qəfil azalma/əskilmə; **a ~ in oil** neftin qiymətinin qəflətən aşağı düşməsi; 2. böhran *(iqtisadi)*; 3. marağın azalması; **a ~ in theatre attendance** teatra gələnlərin marağının azalması

**slump** [slʌmp] *n* II bataqlıq

**slump²** [slʌmp] *v* 1. qəflətən və ya kəskin surətdə düşmək *(qiymət, mallara tələbat haq.)*; *Prices have slumped Qiymətlər qəflətən və kəskin surətdə düşüb*; 2. qəflətən kəsmək/dayanmaq/sakitləşmək *(külək haq.)*; 3. oturmaq, əyləşmək, özünü atmaq; *Tired from her walk, she slumped (down) onto the sofa Gəzməkdən yorulduğundan o özünü divanın üstünə atdı/divanın üstündə daş kimi oturdu*; 4. ağır-ağır/çətinliklə hərəkət etmək



**slumpy** [ˈslʌmpi] *adj* bataqlıq, bataqlığı çox olan, bataqlıqlaşmış

**slung** [slʌŋ] **to sling** *felinin pt, pp formaları*

**slunk** [slʌŋk] **to slink** *felinin pt, pp formaları*

**slur¹** [slə:ʳ] *n* 1. ləkə *(həm də məc.)*; **to cast/to put/to throw a ~ on/upon** ***smb./smth.*** bir kəsi/şeyi ləkələmək, bir kəsə/bir şeyə ləkə salmaq; **to keep** ***one's*** **reputation free from all ~s** adını/şöhrətini ləkəsiz saxlamaq, adına/şöhrətinə ləkə düşməsinə imkan verməmək; 2. böhtan, iftira; böhtanlı ittiham, təhqiranə eyham; 3. qarışıq/qeyri-dəqiq tələffüz *(səslər, sözlər haq.)*

**slur²** [slə:ʳ] *v* **(-rr-)** 1. səliqəsiz/qeyri-dəqiq/dolaşıq tələffüz etmək; 2. yemək *(sözü)*; *He was drunk and kept slurring his words O, sərxoş idi və sözlərini yeyirdi (danışanda)*; 3. dolaşıq/qarışıq yazmaq; 4. səliqəsiz/diqqətsiz/başdansovma etmək; **to ~** ***one's*** **lesson** dərsini başdansovma etmək/öyrənmək; 5. **(over)** üstünü vurmamaq/açmamaq, üstündən sükutla keçmək, göz yummaq; **to ~ over the faults** nöqsanlara göz yummaq, nöqsanların üstündən sükutla keçmək; 6. ləkələmək, ləkə salmaq *(həm də məc)*; 7. notların sırasına ara vermədən çalmaq və ya oxumaq, notları bir-birinə qarışdırmaq

**slurp** [slə:p] *v* hortuldatmaq *(sıyıq yeməyi)*; *He slurped (down) his soup greedily O, şorbasını acgözlüklə hortuldatdı*

**slush¹** [slʌʃ] *n* 1. xəşələ buz *(çaylar donmağa başladığı və ya yazda buz əriməyə, açılmağa başladığı zaman əmələ gələn nazik, yumşaq buz)*; 2. ərimiş qar; sıyıq palçıq, çamır; 3. *d.d.* sentimental boşboğazlıq/cəfəngiyyat; 4. boş/cəfəng ədəbiyyat

**slush²** [slʌʃ] *v* 1. üstünə əndərmək *(suyu və s.)*; 2. çamırda/sıyıq palçıqda yerimək; 3. *tik.* yarıqları doldurmaq; 4. *hərb.* lülənin içini təmizləmək *(silahda)*

**slushy** [ˈslʌʃi] *adj* 1. palçıqlı, çamırlı; ~ **pavements** palçıqlı səkilər; 2. açıq, rəngsiz; ~ **tea** açıq/rəngsiz çay; 3. sentimental, mənasız, yüngül; ~ **poetry** sentimental/yüngül poeziya; **a ~ novel** sentimental roman

**slut** [slʌt] *n* 1. pinti, natəmiz *(adam)*; 2. şırtı fahişə/qəhbə

**sluttish** [ˈslʌtiʃ] *adj* 1. pinti, natəmiz; **a ~ woman** pinti/natəmiz qadın; 2. yaramaz, çirkin; ~ **behaviour** yaramaz/çirkin davranış

**sly** [slai] *adj* 1. bic, hiyləgər, kələkbaz, fəndgir; **a ~ person** bic/hiyləgər/kələkbaz adam; 2. işvəli, işvəkar; **a ~ smile** işvəli/işvəkar təbəssüm; **a ~ glance/look** işvəli/işvəkar baxış; 3. gizli, məxfi; **on the ~** gizlicə, xəlvətcə, xəlvəti; *She must have been having lessons on the sly Güman ki, o xəlvətcə dərs alırmış*

**slyly** [ˈslaili] *adv* bic-bic, işvəkarcasına; **to look at** ***smb.*** ~ bir kəsə bic-bic/işvəkarcasına baxmaq; *She looked slyly at me O işvəkarcasına mənə baxdı*

**slyness** [ˈslainis] *n* 1. biclik, hiyləgərlik, kələkbazlıq, fəndgirlik; 2. işvə, işvəkarlıq

**smack¹** [smæk] *n* I 1. dad, təm; **a ~ of a garlic** sarımsaq dadı/təmi; 2. iy, qoxu; **a ~ of resin** rezin iyi; *A smack of resin was in the air Havada rezin iyi vardı*; 3. bir az, bir damcı; **to add a ~ of pepper/salt to a dish** yeməyə bir az istiot/duz qatmaq

**smack** [smæk] *n* II 1. şapalaq; **to give** ***smb.*** **a ~ in the face** bir kəsin üzünə şapalaq vurmaq; 2. marçıldatma, marçıltı; **to give** ***smb.*** **a good ~** bir kəsi bərk-bərk öpmək/maç eləmək; 3. zərbə; **to give the ball a hard ~** topa bərk zərbə endirmək *(kriket oyununda)*; 4. partıltı; *We heard the smack outside Biz bayırda partıltı eşitdik*

**smack** [smæk] *n* III balaca qayıq *(balıq tutmaq üçün)*

**smack²** [smæk] *v* I 1. dad/təm vermək, dadı/təmi olmaq; **to ~ well/badly** yaxşı/pis dadı olmaq; 2. iylənmək, iyi olmaq, iy vermək; *The bread smacks of smoke Çörək his iyi verir*; 3. hiss etmək, hiss olunmaq; *His manner smacks of self-conceit Onun davranışında təkəbbür hiss olunur*

**smack** [smæk] *v* II 1. öpmək, maç eləmək; **to ~** ***smb.*** bir kəsi öpmək/maç eləmək; 2. marçıldatmaq; **to ~** ***one's*** **lips** dodaqlarını marçıldatmaq; 3. şıqqıldatmaq, şaqqıldatmaq *(qamçını)*; 4. şappıldatmaq, şappıltı ilə vurmaq; **to ~** ***smb.*** **on the back/on the shoulder** bir kəsin kürəyinə/çiyninə şappıltı ilə vurmaq; 5. vurmaq, döymək; şapalaqlamaq; **to ~ a child** uşağı şapalaqlamaq; *He smacked his hand down on his knee O, şappıltı ilə əlini dizinə vurdu*

**smacker** [ˈsmækəʳ] *n* səsli öpüş, maç

**smacking** [ˈsmækiŋ] *n* şapalaqlama; **to give** ***smb.*** **a good ~** bir kəsi yaxşıca şapalaqlamaq

**small¹** [smɔ:l] *n* 1. nazik və dar hissə *(bir şeydə)*; **the ~ of the leg** qıçın topuqla baldır arasındakı hissəsi; **the ~ of the back** bel; 2. **(the ~)** *top.i* alçaqboylu adamlar; uşaqlar;

◊ **by ~ and ~** tədricən, yavaş-yavaş, aramla

**small²** [smɔ:l] *adj* 1. kiçik, balaca; **a ~ room** balaca/kiçik otaq; **a ~ territory** balaca/kiçik ərazi; **a ~ man** balaca adam; **a ~ child** balaca/kiçik uşaq; **a ~ group** kiçik qrup; **to break** ***smth.*** **into ~ pieces** bir şeyi kiçik/balaca parçalara qırmaq; *The coat is small for me Palto mənə balacadır*; 2. xırda; **a ~ farmer** xırda fermer; ~ **industries** xırda sənaye sahələri; ~ **coin** xırda pul; ~ **grapes** xırda üzüm; ~ **print** xırda çap; ~ **rain** xırda yağış; ~ **hand** xırda xətt; **to write in ~ letter** xırda hərflərlə yazmaq; 3. az, az əhəmiyyətli; ~ **detail** az əhəmiyyətli təfərrüat; **to have ~ knowledge of** ***smth.*** bir şey haqqında az biliyi

olmaq; 4. ikinci dərəcəli, orta; **a ~ poet** orta şair; 5. yaramaz, alçaq, rəzil, əclaf; **~ men** yaramaz/rəzil adamlar; 6. alçalmış, alçaldılmış; **to feel** ~ özünü alçalmış hiss etmək; **to make** *smb.* **look** ~ bir kəsi alçaltmaq; 7. qısamüddətli; **a ~ time** qısamüddətli vaxt; 8. qısa; **a ~ distance** qısa məsafə; 9. az, bir ovuc, az miqdar; **in ~ numbers** az miqdarda; **~ audience** bir ovuc/az miqdar tamaşaçı/dinləyici; 10. zəif; **a ~ cold** zəif soyuq; **~ pulse** zəif nəbz; 11. alçaq *(səs haq.)*; **in a ~ voice** alçaq səslə; 12. kasıb, sadə; **to live a ~ way** sadə/kasıb yaşamaq; 13. az; cüzi; **~ crop/harvest** az/cüzi məhsul; 14. pis; **~ appetite** pis iştaha;

◊ **on the ~ side** balaca/dar *(ölçüyə görə); The gloves are on the small side Əlcək balacadır/dardır*; **~ talk** boşboğazlıq, cəfəngiyyat, cəfəng söhbət/danışıq

**small[3]** [smɔ:l] *adv* xırda, xırda-xırda; **to write ~** xırda/xırda-xırda yazmaq; **to chop** *smth.* **up ~** bir şeyi xırda-xırda doğramaq

**small-arms** ['smɔ:la:mz] *n pl hərb.* yüngül silahlar

**small-beer** ['smɔ:lbɪə'] *n* 1. zəif/yüngül pivə; 2. xırdaçılıq, boş şey; **to think ~ of** *smb./smth.* bir kəs/bir şey haqqında yüksək fikirdə olmamaq

**small-cattle** ['smɔ:l.kætl] *n k.t.* xırdabuynuzlu heyvan, davar *(qoyun, keçi)*

**smallish** ['smɔ:lɪʃ] *adj* aztəhər, balacatəhər, gödərək, dartəhər, alçaqtəhər; **a ~ man** alçaqtəhər/gödərək adam

**small-minded** ['smɔ:l'maɪndɪd] *adj* məhdud, dar, birtərəfli; dardüşüncəli, dayaz, uzağıgörməyən; **a ~ man** dardüşüncəli adam

**small-mindedness** ['smɔ:l'maɪndɪdnɪs] *n* məhdudluq, dardüşüncəlilik, dayazlıq

**smallness** ['smɔ:lnɪs] *n* kiçiklik, darlıq, balacalıq

**smallpox** ['smɔ:lpɔks] *n tib.* çiçək *(xəstəlik)*

**small shot** ['smɔ:lʃɔt] *n* qırma, saçma

**smarmy** ['sma:mɪ] *adj d.d.* yaltaq; ikiüzlü, riyakar, qılığagirən; **a ~ salesman** qılığagirən satıcı; **a ~ smile** riyakar/yaltaq təbəssüm

**smart[1]** [sma:t] *n* şiddətli/kəskin ağrı; *The smart of his wound kept him awake Onun yarasının şiddətli/kəskin ağrısı onu yatmağa qoymadı*

**smart[2]** [sma:t] *adj* (-er, -est) I 1. bərk, kəskin, ağır, amansız; **~ blow** bərk/ağır/kəskin zərbə; **~ punishment** ağır/amansız cəza; **to give a ~ thrashing** yaxşıca kötəkləmək/cəzalandırmaq; 2. bərk, tünd *(şərab və s. haq.)*; 3. *amer. d.d.* böyük, çoxlu, çox böyük/yüksək; **~ price** çox yüksək qiymət; **~ distance** çox böyük məsafə; 4. güclü; **~ frost/rain** güclü şaxta/yağış

**smart** [sma:t] *adj* II 1. cəld, yeyin, iti; sürətli, tez; **~ walk** iti/cəld yeriş; **~ attack** cəld/iti hücum; *He went off at a smart pace O, iti/cəld addımlarla çıxıb getdi*; 2. zirək, diribaş, əlli-ayaqlı; **a ~ servant** zirək/diribaş/əlli-ayaqlı xidmətçi; 3. düşüncəli, fərasətli, bacarıqlı, ağıllı; **a ~ person** düşüncəli/fərasətli/ağıllı adam; **a ~ child** fərasətli/ağıllı uşaq; **a ~ carpenter** bacarıqlı/ağıllı dülgər; 4. fəndgir, çevik, mahir, zirək; **~ deal** çevik saziş/sövdə; 5. ağıllı; **a ~ idea** ağıllı fikir; 6. kobud, qaba; **a ~ answer** qaba/kobud cavab; **a ~ garden** səliqəli bağ/bağça; **a ~ dress** səliqəli paltar; *You look very smart in your new suit Təzə kostyumunda/kostyumunuzda sən/siz çox səliqəli görünürsən/görünürsünüz*

**smarten** [sma:tn] *v* (**up**) *d.d.* 1. bəzəmək, gözəlləşdirmək, səliqəyə/qaydaya salmaq; **to ~ up** *one's* **room** otağını səliqəyə/qaydaya salmaq, otağını yığışdırmaq; 2. bəzəmək, geyinib-kecinmək, özünə bəzək vermək; *You'll have to smarten (yourself) up a bit before you go out Sən/Siz bayıra çıxmazdan əvvəl özünə/özünüzə bir az bəzək-düzək verməli olacaqsan/olacaqsınız*

**smartness** ['sma:tnɪs] *n* 1. gözəllik, qəşənglik *(paltar haq.)*; 2. zəriflik, incəlik; 3. hazırcavablıq, fərasət; zirəklik, diribaşlıq, bacarıq; 4. cəldlik, çeviklik, məharət

**smash[1]** [smæʃ] *n* 1. gurultu, xarıltı, şaqqıltı, gumbultu; 2. toqquşma, katastrof; 3. tam dağılma, məhv/tələf/həlak/puç/zay olma; **to break/to knock to ~** tikə-tikə/parça-parça etmək; **to go to ~** 1) uçmaq, dağılmaq, parça-parça/tikə-tikə olmaq *(həm də məc.)*; 2) puç/heç olmaq, boşa çıxmaq *(səy, cəhd haq.)*; 4. müflis olma, iflas; **to go to ~** müflis olmaq, iflasa uğramaq; 5. darmadağın etmə *(düşməni)*; 6. *d.d.* məhvedici/ağır zərbə

**smash[2]** [smæʃ] *v* 1. sındırmaq, qırmaq, qırıq-qırıq etmək; **to ~ the door (open)** qapını sındırıb/qırıb açmaq; **to ~ a tea-cup** çay fincanını qırmaq/qırıq-qırıq etmək; 2. qırılmaq, sınmaq, qırıq-qırıq/parça-parça olmaq; 3. *fiz.* parçalanmaq; 4. məhv/darmadağın/dəf/alt-üst etmək; **to ~ a theory** nəzəriyyəni alt-üst etmək; **to ~ (up) an organization** təşkilatı darmadağın etmək; **to ~ an attack** hücumu dəf etmək; **to ~ an opponent** rəqibi darmadağın etmək *(idmanda)*; 5. atmaq *(daş)*; **to ~ a stone through a window** pəncərəyə daş atmaq, pəncərəni daşla sındırmaq; 6. iflasa uğratmaq; müflisləşdirmək, müflis etmək; **to ~ down** dağıtmaq, sındırmaq; **to ~ down a fence** hasar dağıtmaq/sökmək; **to ~ in** 1) sınmaq, dağılmaq; 2) sındırmaq, qırmaq; **to ~ in a door** qapı sındırmaq/qırmaq *(içəri girmək üçün)*; **to ~ up** 1) parça-parça/tikə-tikə etmək; 2) parça-parça/tikə-tikə olmaq

**smasher** ['smæʃə'] *n* 1. *d.d.* ağır/məhvedici zərbə; 2. inkaredilməz dəlil

**smashing** ['smæʃɪŋ] *adj* 1. dağıdıcı, sarsıdıcı, məhvedici; 2. əla, çox gözəl, fövqəladə, heyrətamiz; **~ success** əla/heyrətamiz müvəffəqiyyət; *We had a smashing holiday Biz əla bayram keçirdik*

**smash-up** ['smæʃʌp] *n* 1. *d.d.* tam məğlubiyyət; 2. qəza, bədbəxt hadisə *(dəmiryolunda və s.)*



**smatter** ['smætə'] *v* 1. **(of)** səthi/təxmini bilmək, bir təhər baş çıxartmaq; 2. **(in, at)** qeyri-ciddi məşğul olmaq, əylənmək *(bir şeylə)*; 3. boşboğazlıq/naqqallıq etmək, çərənləmək, laqqırtı vurmaq

**smattering** ['smætərɪŋ] *n* səthi bilik; **to have a ~ of French/German/English** fransız/alman/ingilis dilindən səthi biliyə malik olmaq

**smear[1]** [smɪə'] *n* 1. ləkə; **a ~ of blood** qan ləkəsi; 2. böhtan, şər; *That story was a smear to discredit the Prime Minister O əhvalat baş naziri hörmətdən salmaq üçün bir böhtan idi*

**smear[2]** [smɪə'] *v* 1. sürtmək, çəkmək; yağlamaq; batırmaq *(yağla, boya ilə və s.)*; *Be careful; if you touch the wall, you'll smear the fresh paint Ehtiyatlı ol/olun, əgər divara toxunsan/toxunsanız, yeni çəkilmiş boyaya batacaqsan/batacaqsınız*; 2. ləkələmək; *I've smeared my coat/my shirt Mən paltomu/köynəyimi ləkələmişəm*; 3. *d.d.* biabır etmək, ləkələmək; *The paper printed this story to smear the President Qazet Prezidenti biabır etmək üçün bu əhvalatı dərc etdi*

**smell[1]** [smel] *n* 1. iybilmə, iy duyğusu; **organ/sense of ~** iybilmə üzvü; **a fine/a keen sense of ~** zərif iybilmə duyğusu; *Can birds smell Quşlar iy bilirlərmi?*; 2. iy, qoxu; **sweet ~** ətir, xoş iy, rayihə; *Taste and smell are closely connected Dad və iy sıx əlaqəlidir*; 3. pis iy/qoxu, üfunət; 4. işarə, əlamət, iz; *There is a smell of corruption/of treachery here Burada korrupsiya/satqınlıq əlaməti var*; 5. iyləmə, qoxulama; **to take a ~ at** *smth.* bir şeyi iyləmək;

◊ **~ of powder** hərbi təcrübə

**smell[2]** [smel] *v* (*pt, pp* **smelt** *və ya* **smelled**) *(Davamedici zaman formalarında işlənmir; çox vaxt* **can** *və ya* **could**-*la işlədilir)* 1. iy/qoxu hiss etmək; **to ~ gas** qaz iyi/qoxusu hiss etmək; 2. hiss etmək; *He smelt a plot O hiss etdi ki, qəsd hazırlanır; He smelt danger and ran O, təhlükə hiss etdi və qaçdı*; 3. iyləmək, qoxulamaq; **to ~** *smth.*, **to ~ at** *smth.* bir şeyi iyləmək; *Smell this and tell me what you think it is Bunu iylə/iyləyin və mənə de/deyin görüm bu nədir?*; 4. iyi/rayihəsi olmaq, iylənmək; **to ~ good/nice/sour** yaxşı/qəşəng/turş iyi olmaq, yaxşı/qəşəng/turş iylənmək; **to ~ of paint** boya iylənmək; *His breath smells of garlic Onun nəfəsi sarımsaq iylənir*; 5. pis/üfunət iylənmək, pis iyi olmaq, pis iy vermək; *Her house smells of dogs Onun evi it iylənir, Onun evindən it iyi gəlir*

**smelly** ['smelɪ] *adj d.d.* pis iyli/qoxulu, pis iy verən, iylənmiş, qoxumuş, üfunətli; **a ~ room/person** pis iyli otaq/adam; **a ~ feet /breath** üfunətli ayaqlar/nəfəs

**smelt[1]** [smelt] **to smell** *felinin pt, pp formaları*

**smelt[2]** [smelt] *n tex.* əritmə, əridilmə *(metal haq.)*, əridilmiş metal

**smelt[3]** [smelt] *v* əritmək *(metalı)*

**smelter** ['smeltə'] *n* metaləritmə zavodu

**smile[1]** [smaɪl] *n* təbəssüm; gülümsəmə; **pleasant /scornful ~** xoşagələn/nifrət ifadə edən təbəssüm; **ironical ~** istehzalı təbəssüm; **to give a ~ to** *smb.* bir kəsə gülümsəmək; **to greet with a ~** təbəssümlə qarşılamaq; *She greeted me with a smile O məni təbəssümlə qarşıladı*

**smile[2]** [smaɪl] *v* gülümsəmək; **to ~ at** *smb./smth.* bir kəsə/bir şeyə gülümsəmək; **to ~ ironically** istehza ilə/rişxəndlə gülümsəmək; *She smiled ironically and said nothing O, istehza ilə gülümsədi və heç nə demədi*;

◊ **to come up smiling** ruhdan düşməmək *(uğursuzluqdan sonra)*

**smirk** [smə:k] *n* gic-gic/özündən razı halda gülümsəmə; **to give a ~** gic-gic/özündən razı halda gülümsəmək

**smite** [smaɪt] *v* (*pt* **smote** [smout]; *pp* **smitten** ['smɪtn]) 1. vurmaq; **to ~** *one's* **hands together** əllərini bir-birinə vurmaq; 2. **(on, upon)** çırpılmaq; *The waves smite upon the cliffs Dalğalar qayalara çırpılır*; 3. əziyyət vermək, incitmək; *My conscience smites me Vicdanım məni incidir/mənə əziyyət verir*;

◊ **to ~ hip and thigh** darmadağın etmək *(düşməni)*; **to be smitten by** *smb.* bir kəsi sevmək, bir kəsə vurulmaq

**smith** [smɪθ] *n* dəmirçi

**smithereens** [.smɪðə'ri:nz] *n* qəlpələr, qırıntılar; **to blow/to smash to/into ~** qırıq-qırıq/parça-parça etmək

**smithy** ['smɪðɪ] *n* dəmirçixana

**smitten** ['smɪtn] **to smite** *felinin pp forması*

**smock** [smɔk] *n* iş paltarı

**smog** [smɔg] *n* smoq *(tüstü ilə qarışmış duman)*

**smoke[1]** [smouk] *n* 1. tüstü; **a column of ~** tüstü sütunu; *The room was full of cigarette smoke Ev siqaret/papiros tüstüsü ilə dolu idi*; 2. papiros çəkmə; **to have a ~** papiros çəkmək; *I haven't had a smoke all day Mən bütün günü papiros çəkməmişəm*; 3. *d.d.* papiros, siqaret; tütün, tənbəki;

◊ **like ~** tez, cəld, bir anda, göz yumub açınca, yel kimi; **to sell ~** aldatmaq; **to end in/to come to/to vanish into ~** boşa çıxmaq; *There's no smoke without fire at. söz Od olmasa tüstü çıxmaz*

**smoke[2]** [smouk] *v* 1. tüstüləmək, tüstülənmək; *The chimney/The fire/The stove smokes badly Buxarı/Ocaq/Soba bərk tüstüləyir*; 2. his vermək, hisləmək *(lampa və s.)*; 3. papiros/siqaret çəkmək; *He likes to smoke O papiros/siqaret çəkməyi xoşlayır; He smokes like a chimney O, çox papiros çəkir; He smokes 20 (cigarettes) a day O, gündə 20 siqaret çəkir*; 4. hisləmək, hisə vermək; **to ~ ham/fish** donuz əti/balıq hisləmək

**smoking** ['smoukɪŋ] *n* papiros çəkmə; *No smoking Papiros çəkmək qadağandır/olmaz (elan)*

**smoking-car** ['smoukɪŋka:'] *n* siqaret/papiros çəkənlər üçün vaqon

**smoking-room** ['smoukɪŋ'rum] *n* papiros/siqaret çəkilən otaq

**smoky** ['smoukı] *adj* **(-ier, -iest)** 1. tüstülü, tüstüvərən; ~ **chimneys/fires** tüstülü bacalar/ocaqlar; a ~ **industrial town** tüstülü sənaye şəhəri; 2. tüstü rəngli; a ~ **grey coat** tüstü rəngli boz palto; **a pair of pretty ~ glasses** tüstü rəngli qəşəng eynək; 3. hisli; ~ **ceiling** hisli tavan

**smooth[1]** [smu:ð] *n* 1. düz/hamar/sığallı səth; 2. sığallama, tumarlama; **to give one's hair a ~** saçını sığallamaq/tumarlamaq, saçına sığal/tumar vermək

**smooth[2]** [smu:ð] *adj* **(-er, -est)** 1. hamar, düz; ~ **skin/paper** hamar dəri/kağız; a ~ **surface** düz səth; a ~ **road** düz/hamar yol; ~ **as silk** ipək kimi hamar; *Her skin is still as smooth as silk Onun dərisi hələ də ipək kimi hamardır;* **to make ~** 1) sığallamaq, tumarlamaq; 2) hamarlamaq, düzəltmək *(yolu və s.)*; 2. yeyilmiş, sürtülmüş; a ~ **tyre** yeyilmiş şin; 3. sakit; ~ **sea** sakit dəniz; 4. rəvan, yüngül, xoşagedən, xoşagələn; ~ **accent** rəvan /xoşagedən tələffüz; 5. yüngül *(şərab və s. haq.)*

**smooth[3]** [smu:ð] *v (həm də* **to ~ away/down/out /over)** 1. tumarlamaq, sığallamaq; hamarlamaq; **to ~ wood with sandpaper** süngərlə taxtanı hamarlamaq; 2. qırışıqları/bürüşükləri düzəltmək; ütüləmək; **to ~ (down) one's dress** paltarını çəkib düzəltmək/ütüləmək; 3. hamarlanmaq, sığallanmaq; 4. aradan qaldırmaq; **to ~ away differences/difficulties** fərqləri/çətinlikləri aradan qaldırmaq; *A new leader could help to smooth (out) the party's difficulties Yeni bir rəhbər partiyanın çətinliklərini aradan qaldırmağa kömək edə bilərdi*; 5. yüngülləşdirmək, sakitləşdirmək, sakitləşmək; **to ~ over** aradan qaldırmaq *(çətinliyi)*

**smoothly** ['smu:ðlı] *adv* 1. yumşaq, rəvan, rahat, sərbəst; *The engine is running smoothly now Mühərrik indi rahat/rəvan işləyir*; 2. yaxşı, asan; *Things are not going very smoothly İşlər çox da yaxşı/rahat getmir*

**smoothness** ['smu:ðnıs] *n* 1. yumşaqlıq, hamarlıq; asanlıq; **the ~ of her skin** onun dərisinin yumşaqlığı/hamarlığı; 2. sakitlik; **the ~ of the sea** dənizin sakitliyi; 3. asanlıq, rahatlıq, rəvanlıq; *The smoothness with which negotiations had proceeded surprised him Danışıqların asanlıqla/rahatlıqla getməsi onu təəccübləndirdi*

**smooth-skinned** ['smu:ðskınd] *adj* yumşaqdərili

**smooth-tongued** ['smu:ðtʌŋd] *adj* 1. şirindil, şirindilli, şirindanışan; 2. yaltaq; qılığagirən

**smote** [smout] **to smite** *felinin pt forması*

**smother** ['smʌðəʳ] *v* 1. nəfəsi çətinləşdirmək; boğmaq; **to ~ with kisses** öpüşlə nəfəsi çətinləşdirmək; *He smothered the baby with a pillow O, körpəni/uşağı balıncla boğdu*; 2. nəfəsi çətinləşmək, boğulmaq; **to ~ with smoke/with dust** tüstüdən/tozdan boğulmaq; 3. söndürmək; **to ~ a fire** yanğını söndürmək; *If you put too much coal on the fire at once, you'll smother it Əgər sən/siz ocağa bir dəfəlik çox kömür töksən /töksəniz, onu (ocağı) dərhal söndürəcəksən/söndürəcəksiniz*; 4. qarşısını almaq, gizlətmək; **to ~ a yawn** əsnəməyin qarşısını almaq; **to ~ anger** acığı/qəzəbi gizlətmək; **to ~ up a scandal** qalmaqalın/qovğanın qarşısını almaq; 5. *aşp.* buğda bişirmək, pörtlətmək *(əti və s.)*

**smothering[1]** ['smʌðərıŋ] *n* təngnəfəslik, təngişmə, boğulma

**smothering[2]** ['smʌðərıŋ] *adj* boğucu; boğanaq, bürkülü, bürkü; ~ **heat** bürkülü isti; ~ **air** boğanaq/ bürkülü hava

**smoulder** ['smouldəʳ] *v* yavaş-yavaş/ tüstüsüz/ alovsuz/ xəfif-xəfif yanmaq; *Cigar was smouldering in the ashtray Siqar külqabında yavaş-yavaş/xəfif-xəfif yanırdı*

**smudge[1]** [smʌdʒ] *n* ləkə, çirk; *You've got a smudge of paint on your cheek Sənin/Sizin yanağında/ yanağınızda boya ləkəsi var*

**smudge[2]** [smʌdʒ] *v* 1. ləkələmək, batırmaq, çirkləndirmək, ləkə salmaq; *He smudged the paper with his dirty hands O, çirkli əlləri ilə kağızı çirkləndirdi/kağıza ləkə saldı*; 2. *məc.* ləkələmək; **to ~ smb.'s record** bir kəsin adını/şöhrətini ləkələmək; 3. bacarıqsız bir tərzdə/bir təhər işləmək

**smudgy** ['smʌdʒı] *adj* çirkli, kirli, çirkləndirilmiş, batmış, bulaşmış

**smug** [smʌg] *adj* özünü bəyənən, özündən razı olan, özünə güvənən/qürrələnən/inanan, lovğa; ~ **smile** lovğa təbəssüm

**smugness** ['smʌgnıs] *n* özünü bəyənmə, özündən razı olma, özünə güvənmə, lovğalıq

**smuggle** [smʌgl] *v* 1. kontrabanda/qaçaqçılıq yolu ilə gətirmək, kontrabanda ilə/qaçaqçılıqla məşğul olmaq; 2. xəlvəti gətirmək/göndərmək; **to ~ a letter out of prison** gizli yolla həbsxanadan məktub göndərmək

**smuggler** ['smʌgləʳ] *n* kontrabandçı, qaçaqçı, kontrabanda ilə məşğul olan adam; *This cave was used by smugglers in the eighteenth century Bu mağaradan kontrabandçılar on səkkizinci əsrdə istifadə etmişlər*

**smuggling** ['smʌglıŋ] *n* kontrabanda, qaçaqçılıq, qaçaq mal gətirmə; *There's a lot of smuggling across this frontier Bu sərhəddən çoxlu qaçaq mal gətirirlər/keçirirlər*

**smugly** ['smʌglı] *adv* lovğa, lovğa-lovğa; *"We have already been there", he said smugly O lovğa-lovğa dedi: «Biz artıq orada olmuşuq»*

**smut[1]** [smʌt] *n* 1. kömür xəkəsi/tozu; 2. his, qurum; 3. qara ləkə; 4. ədəbsizlik, həyasızlıq; 5. sürmə *(taxıl xəstəliyi)*

**smut[2]** [smʌt] *v* 1. çirklətmək, kirləndirmək, bulamaq, ləkələmək, batırmaq; his etmək/eləmək; 2. sürmə xəstəliyi salmaq *(taxıla)*, sürmə xəstəliyinə tutulmaq *(taxıl haq.)*



**smutty** ['smʌtı] *adj* 1. çirkli, kirli; hisli, his tutmuş; 2. tünd *(rəng haq.)*; 3. ədəbsiz, nalayiq; utanmaz; ~ **books** ədəbsiz/nalayiq kitablar; ~ **jokes** ədəbsiz/nalayiq zarafatlar; 4. sürməli, sürmə tutmuş *(taxıl haq.)*

**snack[1]** [snæk] *n* 1. yüngül yemək, qəlyanaltı; **to have a ~** qəlyanaltı etmək, tələsik bir az yemək, ayaqüstü yemək; 2. pay, hissə; **to go ~s** tən yarı bölünmək; öz payını götürmək

**snack[2]** [snæk] *v* 1. qəlyanaltı etmək; 2. tən yarı bölmək/bölünmək

**snack-bar** ['snækba:ʳ] *n* qəlyanaltı, qəlyanaltı dükanı, bufet

**snaffle[1]** ['snæfl] *n* yüyən

**snaffle[2]** ['snæfl] *v* 1. yüyən taxmaq/geydirmək, yüyənləmək *(atı)*; 2. *d.d.* tutmaq, saxlamaq; qamarlamaq, qapmaq, qapışdırmaq; 3. oğurlamaq, çırpışdırmaq; əldə etmək *(əyri yolla)*

**snaffle-bit** ['snæflbıt] *n* yüyən ağızlığı

**snag[1]** [snæg] *n* 1. düyün *(taxtada)*; 2. fır *(ağacda)*; 3. gözlənilməz/nagahani çətinlik/maneə; **to come on/to run against a ~** çətinliyə/maneəyə rast gəlmək; *There was a snag in the talks Danışıqlarda əngəl/çətinlik vardı/əmələ gəldi*; 4. *d.d.* parça, tikə; bir tikə/parça; **a ~ of bread** bir parça/tikə çörək; **a ~ of cheese** bir parça/tikə pendir; *He broke off a snag of bread O, bir tikə/parça çörək qopartdı*; 5. yığın, topa, qalaq; **a ~ of money** bir yığın/bir qalaq pul; *He came into a snag of money Ona bir topa/qalaq/yığın pul verdilər*

**snag[2]** [snæg] *v* **(-gg-)** 1. maneçilik/çətinlik törətmək; ləngitmək, dayandırmaq *(işi və s.)*; 2. *d.d.* ələ keçirmək; **to ~ a football pass** pası ələ keçirmək *(futbol oyununda)*; 3. tutmaq; **to ~ a taxi** taksi tutmaq; 4. ilişdirmək, ilişmək; *He snagged his sweater on the wire fence O, sviterini məftil hasara ilişdirdi; The net snagged on a rock on the seabed Tor dənizin dibində qayaya ilişdi*; 5. iri budaqları kəsmək *(ağacda)*

**snail** [sneıl] *n zool.* ilbiz;
◊ **at a ~'s pace** çox yavaş/ləng; *The traffic was moving at a snail's pace Nəqliyyat çox yavaş hərəkət edirdi*

**snake[1]** [sneık] *n* 1. ilan; **the skin of a ~** ilan dərisi; *A snake coiled in the grass Otun içində bir ilan qıvrıldı*; 2. yalançı/yaramaz/rəzil adam;
◊ **to raise/to wake ~s** qalmaqal/dava-dalaş salmaq; **a ~ in the grass** özünü dost kimi göstərən riyakar adam

**snake[2]** [sneık] *v* 1. sürünmək; burulmaq, qıvrılmaq; 2. boynunu uzatmaq; 3. burulmaq *(yol və s. haq.)*; *The road snakes through the mountains Yol dağların arası ilə burulur*; 4. xəlvəti/gizlicə qaçıb aradan çıxmaq

**snake-bite** ['sneıkbaıt] *n* ilan dişləməsi

**snake-charmer** ['sneıktʃa:məʳ] *n* ilan ovsunçusu, ilan ovsunlayan adam

**snake-skin** ['sneık.skın] *n* ilan dərisi

**snake-venom** ['sneık.venəm] *n* ilan zəhəri

**snaky** ['sneıkı] *adj* 1. ilanabənzər, ilanaoxşar, ilan kimi; 2. qıvrılan; **a ~ road/river** qıvrılan yol/çay; 3. ilan bol olan, çox ilan olan; **a ~ forest** ilan bol/çox olan meşə; 4. zəhərli; kinli, qəzəbli, acıqlı

**snap[1]** [snæp] *n* 1. yapışma, tutma; tutma *(dişlə)*; dişləmə, qapma, diş yeri; sancma *(həşərat və s.)*; 2. kəskin səs *(yerə düşən və ya sınan, partlayan bir şeyin)*; çatırtı, şaqqıltı; **the ~ of twigs** çırpıların çatırtısı; **the ~ of the whip** qamçının/şallağın şaqqıltısı; *The lock shut with a snap Qıfıl şaqqıltı ilə bağlandı*; **to shut the door with a ~** qapını şaqqıltı ilə bağlamaq, qapını çırpmaq; 3. kəskin və qırıq-qırıq nitq; kəskin söz; 4. bənd; **the ~ of a bracelet** qolbağın/biləriyin bəndi; 5. knopka, basmadüymə *(paltar üçün)*; 6. zirəklik, çeviklik, diribaşlıq, qıvraqlıq; **a man with plenty of ~** zirək/çalışqan adam; 7. canlılıq, parlaqlıq, ifadəlilik; **a style with much ~** parlaq/ifadəli üslub

**snap[2]** [snæp] *v* **(-pp-)** 1. qapmaq, tutmaq, dişləmək, dişi ilə tutmaq; **to ~ the meat** əti qapmaq; **to ~ the stick** əl ağacını/əsanı dişi ilə tutmaq; *The dog snapped at my leg İt mənim ayağımı dişlədi/ qapdı/ tutdu; I hate dogs that snap Mən qapan/tutan itləri xoşlamıram*; 2. tələyə salmaq/düşmək; *The trap snapped him O, tələyə düşdü*; 3. (at) yapışmaq *(həm də məc.)*; **to ~ at a rope** kəndirdən/ipdən yapışmaq; **to ~ at an opportunity/at an invitation/at an offer** imkandan/dəvətdən/təklifdən yapışmaq; 4. tələsik/ başdansovdu etmək; **to ~ a hasty decision** tələsik/ başdansovdu qərar qəbul etmək; **to ~ a judgement** 1) tələsik hökm çıxartmaq; 2) tələsik mühakimə yürütmək/fikir söyləmək; 5. cəld/çevik/zirək hərəkət etmək; 6. qapmaq, qarmalamaq, qapışdırmaq; oğurlamaq; 7. kəsik-kəsik/qırıq-qırıq danışmaq; hücum etmək, üstünə atılmaq/düşmək, məzəmmət etmək, danlamaq; *Don't snap at me Məni məzəmmət etmə/etməyin, Məni danlama/danlamayın*; 8. şaqqıldatmaq; **to ~ one's fingers** barmaqlarını şaqqıldatmaq; **to ~ a whip** şallağı/qamçını şaqqıldatmaq; 9. çatırdamaq, çırtıldamaq; *The fire snapped Ocaq çırtıldayırdı*; 10. ani şəkil çəkmək; 11. örtmək *(ağızı, dimdiyi və s. )*; örtülmək; *Her eyes snapped shut Onun gözləri örtüldü*; 12. qırmaq, sındırmaq; **to ~ a stick** budaq qırmaq; **to ~ a rope/a thread** kəndir/sap qırmaq; 13. qırılmaq, sınmaq; *The chain snapped Zəncir qırıldı*; 14. kəsmək; **to ~ ties** əlaqələri kəsmək; **to ~ down** qoymaq; **to ~ down the foot** *id.* ayağı yerə qoymaq; **to ~ off** 1) qopartmaq, dişləyib qopartmaq; 2) qapmaq, sınıb/qopub düşmək; **to ~ out** yandırmaq, oda tutmaq; hirslə/acıqla/qeyzlə demək; kəsmək, kəsib ayırmaq;
◊ **to ~ smb.'s head/nose off** bir kəsə kəskin

kobud/ qaba tərzdə cavab vermək, bir kəsə söz qaytarmaq, bir kəsə qarşı ədəbsizlik etmək

**snapper** [ˈsnæpəʳ] *n* 1. qaba/kobud/ədəbsiz adam; 2. sort/qapan it; 3. basmadüymə *(paltarda)*; 4. kəskin irad; 5. *d.d.* tapança, pistolet

**snappily** [ˈsnæpılı] *adv* cəld, tez, tələsik; *"Go away", she said snappily "Çıx get/gedin", o tələsik dedi*

**snappish** [ˈsnæpıʃ] *adj* 1. bəhanəçi, bəhanə axtaran, hər şeyə irad tutan; tez acıqlanan/hirslənən; deyingən, daim donquldanan; 2. kəskin, kobud, kəsik-kəsik *(nitq haq.)*; 3. qapan, tutan, sort *(it haq.)*; 4. tələtümlü *(dəniz haq.)*

**snappy** [ˈsnæpı] *adj d.d.* **(-ier, -iest)** 1. cəld, çevik, zirək, ani, tez; **a ~ dancer** çevik/zirək rəqqasə; *Make it snappy! Cəld ol/olun, Tez ol/olun!* 2. *d.d.* ağıllı, dərrakəli; **a ~ answer** ağıllı cavab; 3. modalı, modaya uyğun; *She is a snappy dresser O, modaya uyğun geyinəndir*

**snare¹** [sneəʳ] *n* tələ; **to fall into ~** tələyə düşmək; *The fox's foot was caught in a snare Tülkünün ayağı tələyə düşdü, Tələ tülkünün ayağından tutdu*

**snare²** [sneəʳ] *v* tələyə salmaq; **to ~ a fox** tülkünü tələyə salmaq

**snarl¹** [sna:l] *n* I 1. düyün, dolaşıq kələf; 2. dolaşıqlıq, dolaşıq vəziyyət; qarışıqlıq; **a ~ in traffic** küçə hərəkətində tıxac/əngəl, küçə hərəkətinin dolaşıqlığı

**snarl** [sna:l] *n* II nərilti; mırıltı, mırıldama, nərildəmə *(heyvan haq.)*

**snarl²** [sna:l] *v* I 1. qarışdırmaq, dolaşdırmaq; **to ~ *one's* hair** saçlarını dolaşdırmaq; **to ~ a simple problem** sadə problemi dolaşdırmaq; 2. qarışmaq, dolaşmaq; 3. tələyə/tora salmaq /düşmək

**snarl** [sna:l] *v* II 1. nərildəmək, mırıldamaq *(heyvan haq.)*; 2. donquldanmaq, deyinmək, söylənmək; *He snarled O deyindi/donquldandı*; **to ~ against *smth.*** bir şeydən deyinmək

**snatch¹** [snætʃ] *n* 1. tutma, yapışma; qapma, qarmalama; **the ~ of a dog** itin tutması/qapması; **to make a ~ at *smth.*** bir şeyi tutmaq/qarmalamaq, bir şeydən yapışmaq; 2. an, məqam, zaman, vaxt, ləhzə; qısa müddət, dəqiqə; **a ~ of pleasure** bir anlıq/ dəqiqəlik əyləncə; **a ~ of spring in January** yanvarda bir neçə mülayim yaz günü; **to get a ~ of sleep** bir an yatmaq; **to work by/in ~es** fasilələrlə/ hərdənbir işləmək; 3. hissə, parça; **~es of conversation** söhbətin parçaları; 4. yüngül qəlyanaltı; tələsik hazırlanmış yemək; **to take a ~** bir az qəlyanaltı etmək, tələsik yemək; 5. *hərb.* əsir tutma; 6. *id.* atma *(topu və s.)*

**snatch²** [snætʃ] *v* 1. tutmaq, qapmaq, qarmalamaq, qapışdırmaq; əlindən almaq; **to ~ a falling object** düşən şeyi tutmaq; **to ~ a sword/a pen** qılıncı/qələmi əlindən almaq; **to ~ an object from *smb.*'s hand** bir kəsin əlindən bir şeyi almaq; 2. yapışmaq, tutmaq; **to ~ at a rope** kəndirdən yapışmaq/tutmaq; 3. istifadə etmək; **to ~ at a chance** fürsətdən/şansdan istifadə etmək; **to ~ an opportunity** imkandan istifadə etmək, imkanı əldən buraxmamaq; 4. atılmaq, hücum çəkmək *(bir kəsin üstünə)*; 5. dişlə tutmaq, dişləmək; 6. qopartmaq, tapmaq; almaq; **to ~ a moment's leisure/a few hours of sleep** bir an boş vaxt/yatmaq üçün bir neçə saat tapmaq; **to ~ a victory** qələbəni qopartmaq; **to ~ *smb.* from/out of the jaws of death** bir kəsi ölümün çəngindən/pəncəsindən qurtarmaq/ almaq; **to ~ off** qopartmaq, dərmək, üzmək; **to ~ out** dartıb/qapıb almaq; **to ~ up** alıb qurtarmaq

**snatcher** [ˈsnætʃəʳ] *n* oğru; **a baby ~** uşaq oğrusu; **a handbag ~** əl sumkası oğrusu

**snatchy** [ˈsnætʃı] *adj* 1. qırıq-qırıq, kəsik-kəsik, rabitəsiz; 2. qeyri-müntəzəm, sistemsiz

**snazzily** [ˈsnæzılı] *adv* modalı, moda ilə; **to dress ~** moda ilə geyinmək

**snazzy** [ˈsnæzı] *adj* **(-ier, -iest)** modalı və qəşəng; **a ~ little hat** modalı və qəşəng şlyapa; *She's a very snazzy dresser O çox modalı/dəblə geyinəndir*

**sneak¹** [sni:k] *n* 1. qorxaq/alçaq/əclaf/namərd adam; 2. yaltaq/qılığagirən adam; 3. oğru, xırda şey oğrusu; 4. yerlə gedən top *(futbolda, kriketdə)*

**sneak²** [sni:k] *adj* gözlənilməz, qəfil; gizli; **a ~ attack** *hərb.* qəfil hücum; **a ~ test of nuclear weapons** nüvə silahlarının gizli sınağı

**sneak³** [sni:k] *v* 1. xəbərçilik/çuğulluq etmək; *She sneaked on her best friend to the teacher O özünün ən yaxşı dostundan müəllimə çuğulluq etdi*; 2. oğrunca çıxmaq; **to ~ out of the room** otaqdan oğrunca çıxmaq; 3. qurtarmaq; qaçmaq, boyun qaçırmaq; **to ~ out of danger** təhlükədən qurtarmaq; **to ~ responsibility** məsuliyyətdən boyun qaçırmaq; 4. bir şeyi xəlvəti/gizlincə etmək; **to ~ *one's* hand to *one's* pistol** əlini gizlicə tapançasına qoymaq; **to ~ money into *smb.*'s hand** bir kəsin əlinə gizlicə pul qoymaq; 5. qorxmaq, qorxaqlıq göstərmək, çəkinmək; 6. yaltaqlanmaq, yaltaqlıq etmək /göstərmək, alçalmaq

**sneaker** [ˈsni:kəʳ] *n* şapşap, nələyin; altı rezin ayaqqabı, tennis oynamaq üçün ayaqqabı

**sneaking** [ˈsni:kıŋ] *adj* 1. alçaq, əclaf, rəzil; qorxaq, qorxacaq, cəsarətsiz; 2. xəlvəti, gizli, örtülü; **a ~ sympathy** gizli/xəlvəti rəğbət; *She had a sneaking sympathy for the rascal Onda bu yaramaza qarşı bir gizli/örtülü rəğbət vardı*

**sneak-thief** [ˈsni:kθi:f] *n* oğru, xırda şey oğrusu

**sneaky** [ˈsni:kı] *adj* 1. alçaq, əclaf, rəzil; 2. qorxaq, cəsarətsiz; 3. yaltaq, qılığagirən, qulluq göstərən, xoşa gəlməyə çalışan; **a ~ behaviour** yaltaq davranış

**sneer¹** [snıəʳ] *n* 1. təbəssüm, gülümsəmə; 2. istehza, masqara, ələ salma, lağa qoyma, rişxənd

**sneer²** [snıəʳ] *v* 1. istehza ilə gülümsəmək/qımışmaq; 2. istehza ilə danışmaq; 3. ələ salmaq, masqaraya/lağa qoymaq, rişxənd etmək, sataşmaq; *He's always sneering at people less clever than he is O həmişə özündən ağılsız adamları masqaraya/lağa qoyur*

**sneeringly** [ˈsnıərıŋlı] *adv* istehza ilə, rişxəndlə; **to speak of/about *smb.* ~** bir kəs haqqında/barəsində istehza ilə danışmaq

**sneeze¹** [sni:z] *n* asqırma, asqırıq; *She let out a loud sneeze O bərkdən/ucadan asqırdı*

**sneeze²** [sni:z] *v* asqırmaq; *The dust made me sneeze Toz məni asqırtdı; Use a handkerchief when you sneeze Asqıranda əl dəsmalından istifadə et/edin*;

◊ **not to be ~d at** yararsız/dəyərsiz olmaq, heç bir şeyə dəyməmək

**snicker** [ˈsnıkəʳ] *v* 1. istehza ilə gülmək, bığaltı gülmək/irişmək; 2. fınxırmaq; 3. gülüb əldən getmək/qəş etmək

**sniff¹** [snıf] *n* 1. fısıldama, fısıltı; burnunu çəkmə; 2. fınxırma, fınxırtı; 3. nəfəs alma/çəkmə; **to get a ~ of sea air** dəniz havasından nəfəs almaq; *One sniff of this is enough to kill you Bundan bir dəfə nəfəs almaq kifayətdir ki, səni/sizi öldürsün*

**sniff²** [snıf] *v* 1. fısıldamaq; burnunu çəkmək; 2. fınxırmaq; «hm» demək; **to ~ disdain** nifrətlə fınxırmaq; **to ~ in contempt/in disapproval** nifrətlə/ bəyənmədən «hm» demək; 3. iyləmək; **to ~ at a rose** qızılgülü iyləmək; 4. nəfəs almaq/çəkmək *(burundan)*; **to ~ the sea air** dəniz havasından nəfəs almaq; **to ~ (up) medicine** dərmanı burun vasitəsilə çəkmək *(toz dərman haq.)*; 5. iyləmək; sezmək, iylə bilmək/tanımaq; **to ~ *smth.* burning** yanan bir şeyi iylə bilmək/sezmək; 6. *məc.* şübhələnmək, hiss etmək; **to ~ danger** təhlükə hiss etmək; **to ~ treason** satqınlıqdan şübhələnmək, satqınlıq hiss etmək

**sniffer-dog** [ˈsnıfədɔg] *n* iybilən it

**sniffy** [ˈsnıfı] *adj d.d.* 1. lovğa, təkəbbürlü, təşəxxüslü, iddialı, başqalarına xor baxan, heç kəsi bəyənməyən; 2. bir az iylənmiş, qoxulu, iyli

**snigger¹** [ˈsnıgəʳ] *n* istehza ilə/bığaltı gülmə, hırıltı, hırıldama

**snigger²** [ˈsnıgəʳ] *v* 1. istehza ilə/bığaltı gülmək, irişmək; *What are you sniggering at? Sən/Siz istehza ilə nəyə gülürsən/gülürsünüz?* 2. istehza ilə demək *(bir şeyi)*

**snip¹** [snıp] *n* 1. kəsmə, çərtmə; kəsik, çərtik, kəsilmiş yer; 2. kəsik tikə, parça, tikə; 3. *d.d.* zəif/ aciz/ bacarıqsız adam, adamcıq; 4. atın alnında ağ ləkə, qaşqa

**snip²** [snıp] *v* **(-pp-)** 1. qayçı ilə cəld/tələsik kəsmək; 2. didib tökmək, parça-parça kəsmək/etmək, kəsib korlamaq, doğrayıb xarab etmək; 3. kəsmək, çapmaq; **to ~ off the ends of hair** saçın uclarını kəsmək

**sniper** [ˈsnaıpəʳ] *n* snayper, sərrast atıcı

**snippet** [ˈsnıpıt] *n* 1. kəsik, tikə, bir tikə/parça; 2. hissə, parça; **~s of information** məlumatın hissələri/ parçaları; **to hear odd ~s of conversation** söhbətin qəribə parçalarını eşitmək

**snivel¹** [ˈsnıvl] *n* 1. fırtıq, selik; 2. ağlama, sızıldama, inləmə, ağlayıb-sızlama; şikayət; 3. ağı, ağı demə, oxşama

**snivel²** [ˈsnıvl] *v* **(-ll-)** 1. fəryad qoparmaq; 2. fısıldamaq; 3. ağlamaq, sızıldamaq, ağlayıb-sızlamaq; 4. oxşamaq, ağı demək; canı yandığını riyakarcasına ifadə etmək

**snob** [snɔb] *n* 1. bambılı, layiq olmadığı mövqe tutan adam; 2. *arx.* meşşan; rəiyyət

**snobbery** [ˈsnɔbərı] *n* 1. snobizm *(özünü aristokratlara oxşatmağa çalışma)*; 2. *top.i* meşşanlar

**snobbism** [ˈsnɔbızm] *n* = **snobbery** *(1-ci məna)*

**snoop¹** [snu:p] *n d.d.* 1. burnunu başqasının işinə soxan adam; 2. xəfiyyə; əməliyyat axtarış iti

**snoop²** [snu:p] *v d.d.* 1. burnunu başqasının işinə soxmaq; 2. güdmək, pusmaq, izləmək; casusluq /xəbərçilik etmək; 3. mənimsəmək, cibə salmaq

**snooty** [ˈsnu:tı] *adj* 1. burnunu dik tutan, özündən bədgüman olan, təkəbbürlü, lovğa, təşəxxüslü; 2. pis, xoşagəlməz, xoşagəlməz, iyrənc

**snooze¹** [snu:z] *n d.d.* qısa yuxu *(gündüz)*; *I usually have a snooze after dinner Mən adətən nahardan sonra bir az yatıram*

**snooze²** [snu:z] *v* 1. *d.d.* mürgüləmək; qısılıb /büzülüb yatmaq; 2. boş-bikar gəzmək, heç bir iş görməmək, tənbəllik etmək, veyllənmək, avara-avara gəzmək; **to ~ time** vaxtı boş-boşuna keçirmək

**snoozy** [ˈsnu:zı] *adj d.d.* yuxulu, yuxucul, yatağan, daim mürgüləyən

**snore¹** [snɔ:ʳ] *n* xoruldama, xorultu

**snore²** [snɔ:ʳ] *v* xoruldamaq; **to ~ oneself awake** öz xorultusuna oyanmaq *(yuxudan)*; *Does your husband snore? Sənin/Sizin ərin/əriniz xoruldayırmı?*

**snort¹** [snɔ:t] *n* 1. xorultu, xorna, xorultu səsi; 2. fınxırma, fınxırtı *(heyvanlarda)*

**snort²** [snɔ:t] *v* 1. xoruldamaq *(heyvanlar)*; 2. fınxırmaq *(at)*; 3. fısıldamaq *(maşın)*

**snotty** [ˈsnɔtı] *adj* 1. fırtıqlı, həmişə burnu axan; **a child with a ~ nose** burnu fırtıqlı uşaq; 2. pis, iyrənc, çirkin; 3. yaman, acıqlı, hirsli, kinli

**snout** [snaut] *n* 1. sifət, üz, burun *(heyvanlarda)*; **the ~ of a pig** donuzun burnu; *Only the crocodile's snout was visible above the water Suyun üzərində ancaq timsahın burnu görünürdü*; 2. xortum *(fildə)*; 3. iri/böyük burun; 4. xortumcuq *(həşəratlarda)*; 5. *bot.* dişicik ağzı; 6. burun, çıxıntı; **the ~ of a ship** gəminin burnu; **the ~ of a rock** qayanın çıxıntısı; 7. lülək *(çaynikdə və s.)*

**snow¹** [snou] *n* 1. qar; **a heavy fall of ~** güclü qar yağması; *Children were playing in the snow Uşaqlar qarda/qarın içində oynayırdılar*; 2. bərk qar yağması/ düşməsi; boran, çovğun; 3. *pl* qar örtüyü; *The summits are covered with virginal-*

*snows Zirvələr toxunulmamış qarla örtülmüşdür;* ◊ **gone with last year's ~s** izsiz-tozsuz yox olmuş; **to roast ~ in a furnace** ≅ xəlbirlə su daşımaq; **the ~s of yester-year** geri qayıtmaz /dönməz keçmiş

**snow²** [snou] *v* **1.** *(adət.* **it** *şəxssiz əvəzliyi ilə işlənir); It snows in winter Qışda qar yağır; It's snowing now İndi/Hal-hazırda qar yağır; It was snowing at that time yesterday Dünən bu zaman qar yağırdı;* **2.** hər tərəfdən yağmaq; *Congratulations/Presents snowed (in) Hər tərəfdən təbriklər/hədiyyələr yağdı;* **3.** **(up)** kəsmək *(qar vasitəsilə); The road is still snowed up Yolu hələ də qar kəsib. Yol hələ də qarla tutulub/ bağlanıb*

**snowball¹** [ˈsnoubɔ:l] *n* qartopu

**snowball²** [ˈsnoubɔ:l] *v* **1.** qartopu oynamaq; **2.** qartopu düzəltmək/yapmaq

**snowcapped** [ˈsnoukæpt] *adj* başı qarla örtülmüş *(dağ haq.)*

**snowdrop** [ˈsnoudrɔp] *n bot.* qargülü, novruzgülü, xəccəgülü

**snowfall** [ˈsnoufɔ:l] *n* **1.** qar, bərk qar yağma/düşmə; **2.** bir dəfə yağan qarın miqdarı

**snowflake** [ˈsnoufleɪk] *n* qar dənəciyi

**snowless** [ˈsnoulɪs] *adj* qarsız; **~ fields** qarsız çöllər; **~ winter** qarsız qış

**snowman** [ˈsnoumæn] *n* *(pl* **-men** [-men]) qar adamı *(uşaqların düzəltdiyi);* **to make/to build a ~** qar adamı qayırmaq/düzəltmək/yapmaq

**snowplough** [ˈsnouplau] *n* qar təmizləyən maşın

**snowshoe** [ˈsnouʃu:] *n* qar ayaqqabısı *(qarda gəzilən)*

**snowstorm** [ˈsnoustɔ:m] *n* qar tufanı/çovğunu

**snub¹** [snʌb] *n* **1.** etinasız/ saymaz/ saygısız/ laqeyd/ saymazyana münasibət; **2.** töhmət, bərk məzəmmət, kobud/kəskin irad; **3.** təhqir, təhqir etmə, həqarət

**snub²** [snʌb] *adj* fındıqburun

**snub³** [snʌb] *v* **(-bb-) 1.** etinasız/saygısız yanaşmaq; alçaltmaq, hörmətdən salmaq, təhqir etmək; **2.** susdurmaq, ağzından vurmaq, sözünü kəsmək; **3.** *arx.* töhmətləndirmək; danlamaq, məzəmmətləmək, məzəmmət etmək, dərsini vermək

**snuff** [snʌf] *n* burunotu; **to take ~** burunotu çəkmək

**snuffle¹** [ˈsnʌfl] *n* **1.** fısıldama, fısıltı; **2.** tın-tınlıq, burunda danışma

**snuffle²** [ˈsnʌfl] *v* **1.** fısıldamaq; **2.** tın-tın/burunda danışmaq

**snuffy** [ˈsnʌfɪ] *adj d.d.* **1.** acıqlı, hirsli; **2.** lovğa, təkəbbürlü

**snug¹** [snʌg] *n* rahat/sakit/xudmani yer *(xüs. qalyanaltıxanada)*

**snug²** [snʌg] *adj* **(-gg-) 1.** rahat, xudmani; **a ~ litle house** balaca rahat/xudmani ev; **a ~ seat by the fire** ocağın qırağında rahat yer; **to make oneself ~** rahat oturmaq/yerləşmək; **2.** kifayət qədər, xeyli; **~ income** kifayət qədər/xeyli gəlir; **3.** yaxşı, qənaətbəxş; **~ dinner** yaxşı/qənaətbəxş nahar; **4.** səliqəli; müntəzəm; **5.** bədənəyapışan, tarım, dar; **a ~ jacket** bədənəyapışan/tarım jaket; **6.** gizli, xəlvəti, örtülü

◊ **~ as a bug in a rug** çox rahat

**snug³** [snʌg] *adv* rahat, səliqəli, səliqə ilə; **to lie ~** rahat uzanmaq

**snuggle** [ˈsnʌgl] *v* **1.** söykənmək, dirənmək; yapışmaq; sıxılmaq, qısılmaq; sığınmaq; yumaq kimi bükülmək *(həm də* **to ~ down***); He snuggled down and slept O qısılıb yatdı;* **2.** özünə sıxmaq; **to ~ *smb.* in *one's* arms** bir kəsi qolları arasına sıxmaq; bir kəsi qucağına sıxmaq; **3.** rahat yerləşmək/yerləşdirmək *(ev, kənd və s. haq.); He snuggled his face into the pillow O, üzünü balınca rahat yerləşdirdi*

**so¹** [sou] *adv* **1.** belə, elə; bu tərzdə; *He mustn't behave so O belə/bu tərzdə davranmamalıdır; Stand just so Bax belə dur/durun; Speak so that you are understood Elə danış/danışın ki, səni/sizi başa düşsünlər; Why so? Nə üçün belə?; Why is the train so crowded today? Nə üçün qatar bu gün belə basabasdır? She isn't so old O çox da elə qoca deyil;* **2.** çox, lap, bərk; *I'm so tired! Mən çox/bərk yorğunam; I'm so pleased to meet you! Mən səninlə/sizinlə tanış olmağıma çox şadam;* **3.** də; *I'm tired – So am I Mən yorğunam –Mən də;* **4.** elədir; *I thought you are French – So Məncə sən/siz fransızsan/fransızsınız – Elədir;* **5.** demək, beləliklə; *So he is going home Demək, o, evə gedir;*

◊ **and ~ on** və sairə, və ilaxır; *I need some paper, a pencil, ink, and so on Mənə bir az kağız, bir karandaş, mürəkkəb və sair lazımdır; So to say, so to speak Necə deyərlər; I've never seen him, so help me God Allaha and olsun, mən onu heç vaxt görməmişəm*

**so²** [sou] *conj* **1.** onun üçün, o səbəbə, ona görə, ona görə də; *It was raining hard and so I didn't go out Bərk yağış yağırdı, onun üçün/ona görə də mən bayıra çıxmadım; It was late, so we went home Gec idi, ona görə də biz evə getdik;* **2.** ... üçün, ... ötrü, ki; *He opened the window so he could see them come O, pəncərəni açdı ki, onların gəlməsini görə bilsin*

**soak¹** [souk] *n* **1.** islatma *(həm də* **soaking***);* **to give the shirt a good ~/soaking** köynəyi yaxşıca islatmaq; **to put in ~** islatmaq, islağa/suya qoymaq; **2.** islağa qoymaq üçün maye; **3.** islatmaq/islağa qoymaq üçün çən

**soak²** [souk] *v* **1.** islatmaq; suya qoymaq; *Leave the dirty clothes to soak Çirkli camaşırları /paltarları islağa qoy/qoyun;* **2.** islanmaq; **to be ~ed to skin** sümüyə qədər islanmaq; **3.** *d.d.* doyunca içmək, keflənmək, sərxoş olmaq; **to ~ up** canına çəkmək, hopdurmaq; **4.** udmaq; *Partitions soak up sound Arakəsmələr səsi udur;*

◊ **to ~ *one's* clay/*one's* face** bərk içmək/sərxoş olmaq

**soaked** [soukt] *adj* islanmış; **a ~ coat** islanmış palto; *My coat is completely soaked Mənim paltom tamamilə islanıb*

**soap¹** [soup] *n* **1.** sabun; **a cake/a bar of ~** bir parça/bir qəlib sabun; **beauty ~** gözəllik sabunu; **2.** *d.d.* yaltaqlıq, yaltaqcasına tərif

**soap²** [soup] *adj* sabun; **a ~ factory** sabun zavodu

**soap³** [soup] *v* **1.** sabunlamaq; sabunlanmaq; *She soaped her hair O, saçını sabunladı;* **2.** *d.d.* yaltaqlanmaq, yaltaqlıq etmək; **to ~ *smb.* down** bir kəsə yaltaqlanmaq, bir kəsə yaltaqlıq etmək

**soap-box** [ˈsoupbɔks] *n* sabunlu; sabun qutusu/yeşiyi

**soap-bubble** [ˈsoupˌbʌbl] *n* sabun köpüyü

**soap-dish** [ˈsoupdɪʃ] *n* sabunqabı

**soaper** [ˈsoupəʳ] *n* sabunbişirən, sabunçu, sabun istehsalatı fəhləsi

**soap powder** [ˈsoupˌpaudəʳ] *n* yuyucu toz, paltar tozu

**soapy** [ˈsoupɪ] *adj* **(-ier, -iest) 1.** sabunlu; **warm ~ water** ılıq sabunlu su; **2.** sabunu xatırladan, sabunaoxşar *(iycə, dadca və s.);* **~ taste** sabun dadı; **3.** *d.d.* yaltaq; riyakar, ikiüzlü

**soar** [sɔ:ʳ] *v* **1.** süzmək *(havada),* yüksəkdə uçmaq; **2.** sürətlə yüksəlmək/qalxmaq; *Prices soared Qiymətlər sürətlə qalxdı;* **3.** ucalmaq *(bina və s. haq.)*

**soaring** [ˈsɔ:rɪŋ] *adj* ucalan, qalxan; **~ prices/profits** qalxan qiymətlər/gəlirlər; **cliffs ~ above the sea** dənizin üzərində ucalan qayalar

**sob¹** [sɔb] *n* hönkürtü, hıçqırıq; **to give a ~** hönkürmək, hönkürə-hönkürə ağlamaq; *Her body shook with sobs Hönkürtüdən onun bədəni əsdi*

**sob²** [sɔb] *v* **(-bb-) 1.** hönkürmək, hönkür-hönkür ağlamaq; *The child began to sob loudly Uşaq ucadan hönkürməyə/hönkür-hönkür ağlamağa başladı;* **2.** hönkürə-hönkürə demək/danışmaq; *She sobbed out her story O, başına gələn əhvalatı hönkürə-hönkürə danışdı;*

◊ **to ~ *one's* heart out** hönkürtü ilə ağlayıb ürəyini boşaltmaq; *The girl sobbed her heart out when he'd gone O getdikdən sonra qız hönkürtü ilə ağlayıb ürəyini boşaltdı*

**sober¹** [ˈsoubəʳ] *n* **1.** ayıq, ağıllı, sağlam düşüncəli *(adam);* **2.** təmkinli, soyuqqanlı *(adam);* **to have a ~ head in a panic** çaxnaşmada təmkinli/soyuqqanlı olmaq; **3.** obyektiv; **a ~ critic** obyektiv tənqidçi;

◊ **in ~ earnest** tamamilə ciddi/məsuliyyətli

**sober²** [ˈsoubəʳ] *v* **1.** ayıltmaq, ağlını/hissini başına gətirmək; **2.** ayılmaq, ağlı başına gəlmək; **3.** həvəsdən/ruhdan salmaq, soyutmaq, sakitləşdirmək

**sober-minded** [ˈsoubəˈmaɪndɪd] *adj* **1.** təmkinli, sakit; **2.** sağlamfikirli, sağlamdüşüncəli, ağlı başında

**sobriety** [səˈbraɪətɪ] *n* **1.** ayıqlıq; gözüaçıqlıq; **2.** təmkinlilik, mülayimlik; sakitlik; **3.** ciddilik; düşüncəlilik, ağıllılıq, mühakiməlilik

**so-called** [ˈsouˈkɔ:ld] *adj* adlanan, adlandırılan, deyilən; *We are your so-called friends now İndi biz sənin/sizin dostun/dostunuz adlanırıq*

**soccer¹** [ˈsɔkəʳ] *n* futbol

**soccer²** [ˈsɔkəʳ] *adj* futbol; **a ~ ball/match/stadium** futbol topu/yarışı/stadionu; **~ teams** futbol komandaları /taqımları; **a ~ player** futbolçu

**sociability** [ˌsouʃəˈbɪlɪtɪ] *n* adama yovuşma, ünsiyyət, mehribanlıq

**sociable** [ˈsouʃəbl] *n* adamayovuşan, ünsiyyətli, mehriban; *We are very sociable Biz çox mehribanıq*

**social¹** [ˈsouʃl] *n* qəbul, yığıncaq, görüş, iclas; **a church ~** kilsə yığıncağı/iclası

**social²** [ˈsouʃl] *adj* **1.** ictimai; **~ customs /changes /reforms** ictimai adətlər/dəyişikliklər/islahatlar; **~ class** ictimai sinif; **~ order/system** ictimai quruluş/sistem; **~ justice** ictimai ədalət; **~ insurance** ictimai sığorta; **~ welfare 1)** ictimai təminat; **2)** hamilik *(xeyriyyəçilik və tərbiyə məqsədilə);* **~ institutions** ictimai qurumlar; **~ sciences** ictimai elmlər; **2.** dostluq; **~ visit 1)** dostluq viziti/görüşü, dostlara/tanışlara başçəkmə; **to pay a ~ visit** qonaq getmək, tanışlara baş çəkmək; **2)** rəsmi görüş/vizit; **3.** ünsiyyətli, mehriban; **~ character** mehriban xasiyyət; **4.** kübar, kübar dairələrinə mənsub; **5.** hər günkü, məişət; **6.** qrup halında yaşayan; *Most bees are social insects Əksər arılar qrup halında yaşayan həşəratlardır*

**socialism** [ˈsouʃəlɪzm] *n* sosializm

**socialist** [ˈsouʃəlɪst] *n* sosialist

**sociality** [ˌsouʃɪˈælɪtɪ] *n* **1.** adama yovuşma, ünsiyyət, mehribanlıq; **2.** birlik, dostluq, həmrəylik; yoldaşlıq

**socialization, -isation** [souʃəlaɪˈzeɪʃn] *n* **1.** ictimailəşdirmə; **2.** milliləşdirmə

**socialize, -ise** [ˈsouʃəlaɪz] *v* **1.** ictimailəşdirmək; **2.** milliləşdirmək; **3.** cəmiyyəti həyata hazırlamaq; **4.** *amer.* görüşmək, ünsiyyət saxlamaq; cəmiyyətdə olmaq

**social studies** [ˈsouʃlˈstʌdɪz] *n* **1.** sosiologiya; **2.** ictimai elmlər

**society** [səˈsaɪətɪ] *n* **1.** cəmiyyət; **communist/socialist/capitalist ~** kommunist/sosialist/kapitalist cəmiyyəti; **at the dawn of human ~** insan cəmiyyətinin başlanğıcında; **2.** birlik, təşkilat, cəmiyyət; **literary/scientific ~** ədəbi/elmi cəmiyyət; **3.** ünsiyyət, əlaqə; **to shun *smb.*'s ~** bir kəslə əlaqədən/ünsiyyətdən qaçmaq

**sociological** [ˌsousɪəˈlɔdʒɪkl] *adj* sosioloji; **~ theories** sosioloji nəzəriyyələr

**sociologist** [sousɪˈɔlədʒɪst] *n* sosioloq, ictimai elmlər mütəxəssisi

**sock** [sɔk] *n* I **1.** corab; **a pair of ~s** bir cüt corab; **2.** içlik *(ayaqqabıda)*

**sock** [sɔk] *n* II *d.d.* ağır zərbə; **to give** *smb.* **~s 1)** bir kəsi əzişdirmək; 2) bir kəsə qalib gəlmək *(oyunda, mübahisədə)*

**socket** [ˈsɔkıt] *n* **1.** çala, çökək, oyuq; çuxur, batıq; yuva, nov; **the ~ of the hip** *anat.* omba çuxuru; **the eye ~** göz çuxuru; **2.** *tex.* sokol *(elektrik lampasının patrona taxılan metal hissəsi)*; **3.** *el.* patron *(elektrik lampası taxmaq üçün)*; **4.** *tex.* rozetka *(divarda elektrik açarı altına vurulan dairəvi lövhəcik)*

**soda** [ˈsoudə] *n* **1.** *kim.* soda; **2.** sodalı su; qazlı su; **whisky and ~** viski və sodalı su

**sodden** [ˈsɔdn] *adj* **1.** tamam yaş; *My shoes are sodden from walking in the rain Yağışda gəzməkdən mənim ayaqqabım tamam yaşdır*; **2.** sərxoş, kefli

**sodium** [ˈsɔudıəm] *n kim.* natrium *(ağ rəngli yumşaq qələvi metal)*

**sodomite** [ˈsɔdəmaıt] *n* anal sekslə məşğul olan adam; uşaqbaz

**sodomy** [ˈsɔdəmı] *n* pedarastiya, uşaqbazlıq; homoseksualizm *(öz həmcinsi ilə cinsi əlaqədə olma)*

**sofa** [ˈsoufə] *n* taxt, divan; *He was lying on the sofa O, divanda /divanın üstündə uzanmışdı*

**sofa-bed** [ˈsoufəbed] *n* divan-çarpayı

**soft** [sɔft] *adj* **(-er, -est) 1.** yumşaq; **a ~ bed/ fur/ pencil/ hat/ chair** yumşaq çarpayı/xəz/ karandaş/ şlyapa/ stul; **~ metals** yumşaq metallar; **2.** zərif; yüngül; **a ~ skin/ hand** zərif dəri/əl; **~ fragrance** zərif/yüngül rayihə/ ətir; **3.** ahəstə, sakit; **~ music** ahəstə/sakit musiqi; **~ steps** ahəstə/yüngül addımlar; **~ breeze** ahəstə meh; **to sing/to speak in a ~ voice** ahəstə səslə oxumaq/danışmaq; **4.** nəvazişli, zərif, incə; **~ words/glance/smile** nəvazişli sözlər/ baxış/ təbəssüm; **~ sound** *fon.* incə səs; **5.** *d.d.* aşiq, vurğun, məftun; **to be ~ on/upon** *smb.* bir kəsə vurulmaq/ aşiq olmaq; **6.** mülayim; yumşaq; **~ climate** mülayim iqlim/ab-hava; **~ winter** mülayim/yumşaq qız; **7.** isti; **~ air/rain/wind** isti hava/yağış/külək; **a ~ summer evening** mülayim yay axşamı; **8.** sakit; rahat; **~ sleep** sakit/rahat yuxu; **~ sea** sakit dəniz; **9.** həlim, mülayim, xoşxasiyyət, rəhmli, mərhəmətli; təmiz; **~ heart** rəhmli/mərhəmətli/təmiz ürək; **10.** yolayovuq, güzəştə gedən, tez razılaşan, tez yola gələn, üzüyola; dinc, sakit, itaətli, sözə qulaq asan; **11.** ağılsız, gictəhər; **a bit ~ in the head** ağıldan yüngül, başdan xarab; *Have you gone soft in the head Sənin/Sizin başın/başınız xarab olub?*

◊ **the ~er sex** zəif cins *(qadınlar)*; **as ~ as butter/as clay** yağ kimi /mum kimi yumşaq

**soft-boiled** [ˈsɔftbɔıld] *adj* ılıq, boş bişirilmiş *(yumurta haq.)*; **a ~ egg** ılıq bişirilmiş yumurta

**soft fruit** [ˈsɔftfrut] *n* yumşaq meyvə *(tumsuz)*; *Strawberry is a soft fruit Çiyələk yumşaq meyvədir*

**soft-cover** [ˈsɔft.kʌvəˀ] *n* **1.** yumşaq cild; **2.** yumşaq cildli kitab

**soften** [ˈsɔfn] *v* **1.** yumşaltmaq; **to ~** *smb.'s* **heart** bir kəsin ürəyini/qəlbini yumşaltmaq; **2.** yumşaimaq; *The butter will soften out of the fridge Soyuducudan çıxardıldıqda yağ yumşalacaq*; **3.** sakitləşdirmək, yüngülləşdirmək; sakitləşmək, yüngülləşmək; **4.** əritmək; ərimək

**soft-head** [ˈsɔfthed] *n d.d.* səfeh/axmaq/gic/sarsaq adam

**soft-headed** [ˈsɔft.hedıd] *adj* ağıldan kəm, ağlı çatmayan, gictəhər, sarsaq, axmaq, səfeh

**soft-hearted** [ˈsɔftˈha:tıd] *adj* mərhəmətli, ürəyiyumşaq, qayğıkeş, xeyirxah; **a ~ man** mərhəmətli/qayğıkeş/xeyirxah adam

**softish** [ˈsɔftıʃ] *adj* yumşaq, yumşaqtəhər

**softly** [ˈsɔftlı] *adv* zərif, yumşaq; sakit; **to speak ~** yumşaq/zərif/sakit danışmaq; **to treat children too ~** uşaqlarla çox yumşaq rəftar etmək

**soft-money** [ˈsɔftˈmʌnı] *n amer. d.d.* kağız pul

**softness** [ˈsɔftnıs] *n* **1.** yumşaqlıq; **2.** zəriflik; **3.** plastiklik

**soft palate** [ˈsɔftˈpælıt] *n anat.* yumşaq damaq

**softsoap**[1] [ˈsɔftsoup] *n* **1.** maye sabun; **2.** yaltaqlıq, yaltaqcasına tərif

**softsoap**[2] [ˈsɔftsoup] *v* **1.** maye sabunla yumaq; **2.** *d.d.* yaltaqlanmaq, yaltaqlıq etmək, üzə gülmək

**software** [ˈsɔftweəˀ] *n* **1.** kompyuterdə işlənən əşyalar, məs. proqramlar, disketlər və s.

**softwood** [ˈsɔftwud] *n* **1.** iynəyarpaqlı ağac; **2.** iynəyarpaqlı ağacdan hazırlanmış tikinti materialı

**softy** [ˈsɔftı] *n d.d.* **1.** gic, axmaq, sarsaq, səfeh; **2.** zəif/xaraktersiz/iradəsiz adam

**soggy** [ˈsɔgı] *adj* **1.** bataqlıq, nəm; **2.** çox islanmış, canına su çəkmiş, tamam islanmış; **3.** çiy, yaxşı bişməmiş *(çörək haq.)*; **4.** cansıxıcı, bezikdirici, usandırıcı, darıxdırıcı, zəhlətökən; **5.** nəmli, boğucu *(isti haq.)*

**soil**[1] [sɔıl] *n* I **1.** torpaq; **poor ~** münbit olmayan/ məhsul verməyən torpaq; **rich ~** münbit/məhsuldar torpaq; **unbroken/virgin ~** xam torpaq; **sandy/clayey ~** qumlu/gilli torpaq; **2.** ölkə, torpaq, məmləkət, yer; **on foreign ~** özgə torpağında; **on** *one's* **native ~** öz vətənində/torpağında; **a child of this ~ 1)** bu torpağın/məmləkətin/vətənin uşağı; 2) kəndli

**soil** [sɔıl] *n* II **1.** çirk, kir, ləkə *(həm də məc.)*; **2.** tullantı, nəcis, ifrazat; **3.** peyin, kompost *(müxtəlif qarışıqlardan hazırlanan üzvi gübrə)*

**soil**[2] [sɔıl] *v* **1.** çirkləndirmək, kirləndirmək, çirk etmək; **to ~** *one's* **clothes** paltarlarını çirkləndirmək/ kirləndirmək; **2.** çirklənmək, kirlənmək; *White shirts soil easily Ağ köynəklər asanlıqla çirklənir/kirlənir*; **3.** korlamaq, ləkələmək; **to ~** *one's* **reputation** adını/şöhrətini ləkələmək; *His actions have soiled the family name Onun hərəkətləri ailənin adını ləkələdi*; **4.** çirkin içində eşələnmək *(heyvan haq.)*

**soilage** [ˈsɔılıdʒ] *n k.t.* silos bitkiləri, yaşıl yem bitkiləri





**soil map** [ˈsɔılmæp] *n* torpaq xəritəsi

**soil science** [ˈsɔıl.saıəns] *n* torpaqşünaslıq

**soil scientist** [ˈsɔıl.saıəntıst] *n* torpaqşünas

**sojourn**[1] [ˈsɔdʒə:n] *n* müvəqqəti qalma/yaşama; **a brief ~ in the mountain** dağda qısamüddətli qalma/ yaşama

**sojourn**[2] [ˈsɔdʒə:n] *v* müvəqqəti qalmaq/yaşamaq

**sojourner** [ˈsɔdʒə:nəˀ] *n* müvəqqəti sakin

**sol** [sɔl, soul] *n mus.* sol *(diatonik qammanın beşinci notu)*

**solace**[1] [ˈsɔləs] *n* təsəlli, təskinlik; təskinlik/rahatlıq tapma; **to give ~ to a friend** dosta təsəlli/təskinlik vermək; **to find ~ in music** musiqidən təsəlli/ təskinlik tapmaq; *Books are my solace Kitablar mənim yeganə təskinliyimdir/təsəllimdir*

**solace**[2] [ˈsɔləs] *v* **1.** təsəlli/təskinlik vermək; ovundurmaq, sakitləşdirmək; **2.** canlandırmaq, cana gətirmək

**solar** [ˈsouləˀ] *adj astr.* **1.** günəş; **~ year/eclipse** günəş ili/tutulması; **~ system** günəş sistemi; **2.** *əs.* günəşə sitayiş edən

**solder**[1] [ˈsɔldəˀ] *n tex.* lehim; **soft/hard ~** yumşaq/bərk lehim

**solder**[2] [ˈsɔldəˀ] *v* lehimləmək; **to ~ the two pieces together** iki parçanı/hissəni bir yerə lehimləmək

**soldering-iron** [ˈsɔldərıŋ.aıən] *n* lehim aləti, hövnə

**soldier**[1] [ˈsouldʒəˀ] *n* əsgər; **a ~ on duty** növbətçi əsgər; **a disabled ~** şikəst/əlil əsgər; **raw ~** *d.d.* təzə/təcrübəsiz əsgər; **to go for a ~** əsgərliyə getmək

**soldier**[2] [ˈsouldʒəˀ] *v* orduda xidmət etmək

**soldiering** [ˈsouldʒərıŋ] *n* hərbi xidmət

**soldierlike**[1] [ˈsouldʒəlaık] *adj* əsgərəoxşar, əsgəri, əsgər görkəmli; **a ~ fellow** əsgərəoxşar/əsgər görkəmli oğlan; **in a ~ style** əsgər kimi, əsgəri, əsgərəoxşar

**soldierlike**[2] [ˈsouldʒəlaık] *adv* əsgər kimi, əsgərcəsinə

**soldierly** [ˈsouldʒəlı] *adj* **1.** əsgər, əsgəri, əsgərə məxsus/aid, əsgərəoxşar; **~ appearance** əsgəri duruş/görkəm; **2.** qoçaq, igid, cəsarətli, döyüşkən, mübariz, cəngavər

**sole**[1] [soul] *n* **1.** alt, altlıq, pəncə *(ayaqqabıda)*; **2.** pəncə/daban vurma

**sole**[2] [soul] *adj* **1.** bir, bircə; **a ~ reason** bir/bircə səbəb; *His sole reason for leaving his native country was to get a job Onun öz vətənini tərk etməsinin bircə səbəbi iş tapmaq idi*; **2.** tək, təkcə; fərdi, təkbaşına; **the ~ owner** təkcə/təkbaşına sahib

**sole**[3] [soul] *v* pəncə salmaq, daban vurmaq *(ayaqqabıya)*; **to have a pair of shoes ~d** ayaqqabıya pəncə saldırmaq

**solely** [ˈsoullı] *adv* **1.** yeganə, tək, vahid, təkcə, bircə; yalnız, ancaq; **to be ~ responsible for the accident** bədbəxt hadisəyə görə təkcə məsuliyyət daşımaq; **2.** müstəqil, özbaşına, özü; **to do** *smth.* **~** bir şeyi təkbaşına etmək

**solemn** [ˈsɔləm] *adj* **1.** ciddi; **~ warning** ciddi xəbərdarlıq; **~ music** ciddi musiqi; **a ~ face** ciddi sifət; **2.** təntənəli; **~ ceremony/promise/oath** təntənəli mərasim/vəd/and; **3.** vüqarlı, görkəmli, çox böyük; əzəmətli; **a ~ building** görkəmli/ əzəmətli/ çox böyük bina; **4.** rəsmi; **~ declaration** rəsmi bəyanat; **5.** müqəddəs; **~ rite** müqəddəs mərasim; **~ truth** müqəddəs həqiqət

**solemnity** [səˈlemnıtı] *n* **1.** təntənə, dəbdəbə, təmtəraq; əzəmət, ehtişam; *He was buried with great solemnity O, çox böyük dəbdəbə ilə/təmtəraqla dəfn edildi*; **2.** ciddilik; vaciblik; **3.** vüqarlılıq, görkəmlilik; **4.** şənlik, şadyanalıq, bayram, təntənəli mərasim

**solemnize, -ise** [ˈsɔləmnaız] *v* təntənə/dəbdəbə ilə qeyd/bayram etmək; **to ~ a marriage in church** kilsədə dəbdəbə/təntənə ilə nikah kəsdirmək

**solfeggio** [sɔlˈfedʒıou] *n mus.* solfecio *(çalğısız olaraq notla sözsüz oxumaqdan ibarət məşq)*

**solicit** [səˈlısıt] *v* **1.** təkidlə xahiş etmək/istəmək/tələb etmək; **to ~** *smb.* **for money, to ~ money from** *smb.* bir kəsdən təkidlə pul tələb etmək/istəmək; **2.** yalvarıb/yalvar-yaxarla almaq, xahiş edib almaq; qoparmağa/əldə etməyə çalışmaq; **to ~ help** kömək üçün yalvarmaq; **to ~** *smb.* **for alms** yalvarıb-yapışmaqla bir kəsdən sədəqə istəmək; **3.** kişilərin dalınca düşmək, kişilərdən əl çəkməmək *(fahişələr haq.)*: *She was accused of soliciting in public places O, ictimai yerlərdə kişilərin dalınca düşməkdə ittiham edildi*; **4.** təhrik etmək; qızışdırmaq; **to ~ the population to a revolt** əhalini qiyama/üsyana təhrik etmək

**solicitous** [səˈlısıtəs] *adj* **1.** qayğıkeş, qeydə qalan, qayğıçəkən, diqqətli; iltifatlı; **a ~ host** qayğıkeş/ diqqətli/iltifatlı ev sahibi; **to be ~ about** *smb.'s* **health** bir kəsin sağlamlığının qeydinə qalmaq; **~ for** *smb.'s* **future** bir kəsin gələcəyinin qayğısına qalan; **2.** can atan *(bir şeyə)*; çalışan; **~ to gain esteem** hörmət qazanmağa can atan/çalışan

**solicitude** [səˈlısıtju:d] *n* qayğı, qayğıkeşlik, qayğıya/qeydə qalma; **her ~ for her children** onun uşaqları üçün/uşaqlarına qayğısı/qayğıkeşliyi

**solid**[1] [ˈsɔlıd] *n* **1.** *fiz.* bərk cisim; *Milk is a liquid: cheese is a solid Süd mayedir; pendir bərk cisimdir*; **2.** *riyaz.* cisim; *A cube is a solid Kub cisimdir*

**solid**[2] [ˈsɔlıd] *adj* **1.** bərk; **~ food** bərk yemək/qida; **to become ~ on cooling** soyuduldluqda/soyuyanda bərkimək; **2.** qatı, qalın; **~ clouds** qalın buludlar; **~ solution** qatı məhlul; **3.** xalis, təmiz, qatışıqsız; **~ gold** təmiz/xalis qızıl; **~ silver** xalis/qatışıqsız gümüş; **4.** möhkəm; **~ foundation** möhkəm özül/bünövrə/təməl; **5.** güclü, sağlam; **a man of ~ build** sağlam bədənli adam; **6.** qida-

lı, doyumlu, tez doyduran; ~ **meal** doyumlu/qidalı/tez doyduran yemək; **to have a ~ meal** qidalı/doyumlu yemək yemək; 7. inandırıcı, tutarlı, əsaslı; ~ **argument** inandırıcı/tutarlı sübut; 8. ətraflı, ciddi; ~ **reading** ciddi oxu/qiraət; 9. dərin; ~ **respect** dərin hörmət; 10. həmrəy, yekdil; ~ **delegation** həmrəy/yekdil nümayəndə; 11. aramsız, arasıkəsilməz: ~ **rain** aramsız/arasıkəsilməz yağış; 12. tam, düz, bütün; **for a ~ day** bütün gün; *I've been waiting a solid hour Mən tam/düz bir saatdır gözləyirəm*

**solid³** ['sɔlıd] *adv* 1. tam, tamamilə, bütövlükdə; **to go ~ for** *smb./smth.* tam/bütövlükdə bir kəsin/bir şeyin tərəfində olmaq; **to go ~ against** *smb./smth.* tamamilə bir kəsə/bir şeyə qarşı olmaq; 2. bir səslə, yekdilliklə; **to vote** ~ yekdilliklə səs vermək

**solidarity** [.sɔlı'dærıtı] *n* 1. həmrəylik, həmfikirlik, birlik, yekdillik; **national** ~ milli həmrəylik /birlik; ~ **of nations** xalqların həmrəyliyi/birliyi; 2. ümumilik, birlik; ~ **of/in interests** maraqların ümumiliyi; ~ **of/in purpose** məqsəd birliyi

**solid-hoofed, solid-hooved¹** ['sɔlıdhu:ft, ~hu:vd] *adj zool.* təkdırnaqlı; *A horse is a solid-hoofed animal At təkdırnaqlı heyvandır*

**solidify** [sə'lıdıfaı] *v* 1. bərkitmək, qatılaşdırmaq; bərkimək, qatılaşmaq; **to ~ milk** südü qatılaşdırmaq; 2. möhkəmlətmək, möhkəmləndirmək; **to ~ one's knowledge** biliyini möhkəmlətmək; 3. birləşdirmək; **to ~ people into a party** xalqı bir partiyada birləşdirmək

**solidity** [sə'lıdıtı] *n* 1. bərklik, möhkəmlik; qatılıq; **the ~ of an alliance** ittifaqın möhkəmliyi; 2. bütövlük, tamlıq, vahidlik; 3. etibarlılıq, mötəbərlik, sadiqlik

**soliloquy** [sə'lıləkwı] *n* monoloq; **the soliloquies of Hamlet** Hamletin monoloqları

**solitary¹** ['sɔlıtərı] *n* 1. zahid, tərki-dünya; 2. adamayovuşmaz, adamdanqaçan *(adam)*

**solitary²** ['sɔlıtərı] *adj* 1. ayrı, tək, biradamlıq, birnəfərlik; ~ **confinement/imprisonment** biradamlıq həbsxana; **a ~ house** tək ev; **a ~ walk** tək gəzinti; **to lead a ~ life** tək həyat sürmək; **a ~ task** biradamlıq tapşırıq; 2. atılmış, adamsız; **a ~ place** atılmış/adamsız yer; 3. tək, tək-tək, tək-tək təsadüf edilən, nadir; müstəsna; **a ~ case** müstəsna/tək-tək təsadüf edilən hadisə; **a ~ example** nadir misal

**solitude** ['sɔlıtju:d] *n* 1. təklik, tənhalıq, yalqızlıq; **to like in** ~ təklikdə/tənhalıqda yaşamaq; 2. ayrılıq; sahibsizlik, adamsızlıq, baxımsızlıq; **the ~ of a desert** səhranın adamsızlığı

**solo¹** ['soulou] *n (pl* **-as** [-ouz], **-li** [-li:]) 1. solo, solo ifa etmək üçün əsər; 2. solo ifa etmə

**solo²** ['soulou] *adj* 1.solo; ~ **composition** solo əsəri; 2. *av.* ilk müstəqil; ~ **flight** ilk müstəqil uçuş

**solo³** ['soulou] *v* 1. solo ifa etmək; 2. müstəqil/təkbaşına uçmaq

**solo⁴** ['soulou] *adv* solo; tək; **to fly** ~ tək/müstəqil uçmaq

**soloist** ['soulouıst] *n* 1. solist *(nömrəsini tək ifa edən artist)*; 2. müstəqil uçan təyyarəçi

**soluble** ['sɔljubl] *v* 1. izah edilə bilən, həll oluna/edilə bilən; **a ~ problem** həll oluna/edilə bilən problem; **problems that are not readily ~** hazırda həll oluna/edilə bilməyən problemlər; 2. əriyə bilən, əriyən; ~ **coffee** əriyən/əriyə bilən kofe

**solution** [sə'lu:ʃn] *n* 1. həllini tapma; *Try to find a better solution Çalış/Çalışın daha yaxşı bir həll tap/ tapın*; 2. cavab tapma, həll etmə; **the ~ of a crossword** krossvordun cavabını tapma, krossvordu həll etmə; 3. ərimə, həll olma; **a ~ of salt in water** duzun suda ərimәsi/həll olması

**solve** [sɔlv] *v* 1. həll etmək, cavabını tapmaq; **to ~ a problem** problemi həll etmək; **to ~ a riddle** tapmacanın cavabını tapmaq; 2. *riyaz.* həll etmək; **to ~ a problem** tənlik həll etmək

**solvent¹** ['sɔlvənt] *n* 1. əridici, həlledici; *Water is the commonest solvent Su ən adi əridicidir*; 2. *hüq.* ödəmə qabiliyyəti olan/pullu/varlı adam

**solvent²** ['sɔlvənt] *adj* 1. əriyən, həll olunan; ~ **liquids** həll olunan mayelər; 2. ödəmə qabiliyyəti olan, varlı, pullu; **a ~ firm** ödəmə qabiliyyəti olan firma; **a ~ man** varlı/pullu adam; 3. həll olunmaya kömək edən, həlledici

**sombre** ['sɔmbəʳ] *adj* 1. tutqun, buludlu; **a ~ morning** tutqun/buludlu səhər; **a ~ sky** tutqun/buludlu səma; ~ **clothes** tutqun paltar; **a ~ January day** tutqun/ buludlu yanvar günü; 2. qəmgin, kədərli; **a ~ face** qəmgin/kədərli sifət; **to be in a ~ mood** kefi olmamaq, kədərli/qəmli olmaq

**sombrely** ['sɔmbəlı] *adv* tutqun; qəmli, kədərli; ~ **dressed** tutqun geyinmiş

**sombrero** [sɔm'breərou] *n (pl* **-os**) sombrero *(ispanların, meksikanların geyindiyi kənarı enli şlyapa)*

**some¹** [sʌm] *(tam forması)*; [səm, sm] *ixtisar edilmiş formaları) adj* 1.bir; *Some other solution will have to be found Başqa bir həll yolu tapılmalı olacaq; Ask some experienced person Başqa bir təcrübəli adamdan soruş/soruşun; Let's do that some other time Gəl/Gəlin onu başqa bir vaxt edək; He must buy some new clothes O özünə başqa bir təzə paltar almalıdır*; 2. birisi, kimsə, naməlum bir şəxs; *Some man wants to speak to you Birisi/Naməlum bir kəs səninlə/sizinlə danışmaq istəyir;* 3. bəziləri, bəzi; *Some people say that it is not difficult to learn English Bəzi adamlar deyirlər ki, ingilis dilini öyrənmək çətin deyil; Some days he earns more, some days less Bəzi günlər o daha çox, bəzi günlər isə daha az qazanır*; 4. bir az; *I would like some milk Mən bir az süd istərdim*; 5. bir neçə; *It happened some years ago Bu, bir neçə il bundan əvvəl baş verdi*; 6. xeyli; *It takes some time Buna xeyli vaxt lazımdır; The station is some distance Stansiya xeyli aralıdır/uzaqdır*;

◊ ~ **day** bir gün; *I can help you some day Mən bir gün sənə/sizə kömək edə bilərəm*; ~ **time** bir vaxt; *I'll come some time when I'm less busy Mən bir vaxt işim daha az olanda gələrəm*; ~ **few** bir az; *I waited some few Mən bir az gözlədim*

**some²** [sʌm] *(tam forması)*; [səm, sm] *qısaldılmış formaları) indef. pron.* 1. bəziləri, bir paraları; *Some agree with us, and some disagree Bəziləri bizimlə razılaşır, bəziləri razılaşmır; Some of the pupils are late Şagirdlərin bəziləri gecikib*; 2. bir hissəsi; *Some of the paper is damaged Kağızın bir hissəsi xarab olub/korlanıb*;

◊ ~ **of these days** bu günlərdə/yaxınlarda

**some³** [sʌm] *(tam forması)*; [səm, sm] *qısa formaları) adv* təxminən, yaxın; ~ **hundred people** təxminən yüz nəfər adam, yüzə yaxın adam

**somebody** ['sʌmbədı] *indef. pron.* kimsə; *Somebody has taken my pen Kimsə mənim qələmimi götürüb*

**somehow** ['sʌmhau] *adv* bir təhər, bu və ya digər tərzdə; *Somehow I must get a job Mən bir təhər iş tapmalıyam*

**someone** ['sʌmwʌn] *indef. pron.* 1. kimsə, bir kəs; *There's someone in the room Otaqda kimsə var*; 2. vacib şəxs/adam; *He thinks he's really someone O, fikirləşir ki, o həqiqətən də vacib adamdır*

**someplace** ['sʌmpleıs] *indef. adv* = **somewhere**

**somersault¹** ['sʌməsɔ:lt] *n* mayallaq, mayallaq vurma *(havada)*; **double/triple** ~ ikiqat/üçqat mayallaq vurma; **to turn/to make a** ~ mayallaq vurmaq

**somersault²** ['sʌməsɔ:lt] *v* mayallaq vurmaq

**something** ['sʌmθıŋ] *indef. pron.* nəsə, nə isə, bir şey; *There's something in the box Qutuda nəsə var; I want something to eat Mən bir şey/nəsə yemək istəyirəm*

**sometime** ['sʌmtaım] *adv* 1. bir zaman/vaxt; *Come over sometime Bir vaxt gəl/gəlin; I can help you sometime Mən sənə/sizə bir vaxt kömək edə bilərəm*; 2. vaxtilə, bir vaxtlar/zamanlar; *This castle was built sometime in the eighteenth century Bu qəsr vaxtilə on səkkizinci əsrdə tikilmişdir*

**sometimes** ['sʌmtaımz] *adv* bəzən, hərdənbir, arabir; *Sometimes I go to work by metro/by bus/by tram Mən bəzən işə metro ilə/avtobusla/tramvayla gedirəm*

**someway** ['sʌmweı] *adv* bu və ya digər; bir təhər; ~ **or other** bu və ya digər tərzdə/yolla

**somewhat** ['sʌmwɔt] *adv* bir az, müəyyən dərəcə; *I was somewhat surprised to see him there Mən onu orada gördüyümə bir az təəccübləndim; The situation has been changed somewhat since we last met Biz son dəfə görüşəndən bəri vəziyyət bir az/müəyyən dərəcədə dəyişib*

**somewhere¹** ['sʌmweəʳ] *n* bir yer, hər hansı bir yer; *I want to find somewhere to stay Mən qalmaq üçün bir yer tapmaq istəyirəm*



**somewhere²** ['sʌmweəʳ] *adv* 1. harada isə; hara isə; *I've lost my key somewhere Mən açarımı harada isə itirmişəm; Put this bag somewhere Bu çantanı hara isə/bir yerə qoy/qoyun*; 2. təxminən, təqribən; ~ **about two months** təxminən/təqribən iki aya yaxın

**somnambulism** [sɔm'næmbjulızm] *n tib.* somnambulizm, lunatizm *(qeyri-şüuri olaraq yuxuda gəzmə)*

**somnambulist** [sɔm'næmbjulıst] *n* lunatik, somnambul *(yuxuda durub gəzən adam)*

**somniferous** [sɔm'nıfərəs] *adj* 1. yuxu gətirən/gətirici, yatırdan, yatırdıcı; 2. yuxulu, mürgüləyən

**somnolence** ['sɔmnələns] *n* yuxuculluq, daim mürgüləmə; mürgü

**somnolent** ['sɔmnələnt] *adj* 1. yuxuladıcı, yuxugətirən, yatırdıcı; *The noise of the stream had a pleasantly somnolent effect Axının səsi yuxu gətirici xoş bir təsirə malik idi*; 2. yuxulu, mürgüləyən; **to feel rather ~ after a large lunch** möhkəm şam/axşam yeməyindən sonra bərk mürgü hiss etmək

**son** [sʌn] *n* 1. oğul; *I've two sons and a daughter Mənim iki oğlum və bir qızım var; He's his father's son O, atasının oğludur (yəni hər işdə atasına oxşayır)*; 2. gələcək nəsillər; **~s of early pioneers** təzə yerə erkən köçənlərin gələcək nəsilləri;

◊ *Like father, like son at. söz.* ≅ *Ot kökü üstə bitər;* ~ **of Man** bəşər övladı; ~ **of a bitch/of a sea-cook** it oğlu; *I'll kill that son of a bitch when I get my hands on him Əlimə düşəndə o it oğlunu öldürəcəm*; **a ~ of toil** zəhmətkeş, əməkçi; ~ **of the white hen** xoşbəxt/bəxtəvər/bəxtiyar adam

**sonant** ['sounənt] *adj fon.* cingiltili

**sonar** ['sounəʳ] *n amer. dən.* hidrolokator

**sonata** [sə'na:tə] *n mus.* sonata *(müxtəlif temp və xarakterdə olan üç və ya dörd hissədən ibarət instrumental musiqi əsəri)*

**song** [sɔŋ] *n* 1. mahnı; **folk/sea/soldier's** ~ xalq/dəniz/ əsgər mahnısı; 2. oxuma, ötmə; **the nightingale's/ the lark's** ~ bülbülün/torağayın oxuması; 3. şırıltı; **the ~ of the brook** balaca çayın şırıltısı;

◊ **not worth an old** ~ ≅ bir qəpiklik dəyəri olmayan; **to sing the same ~ over and over again** köhnə mahnını dəfələrlə oxumaq, boş-boş danışmaq

**song-bird** ['sɔŋbə:d] *n* çalı quşu, oxuyan quş; *The nightingales and the black-birds are song-birds Bülbüllər və qaratoyuqlar oxuyan quşlardır*

**songbook** ['sɔŋbuk] *n* nəğmə/mahnı kitabı; **a children's** ~ uşaqların mahnı/nəğmə kitabı

**songster** ['sɔŋstəʳ] *n* 1. oxuyan, müğənni *(estradada)*; 2. nəğmə/mahnı yazan şair; 3. mahnılar/nəğmələr toplusu, mahnı kitabçası

**songstress** ['sɔŋstrəs] *n* 1. qadın estrada müğənnisi; 2. mahnı/nəğmə yazan şairə

**son-in-law** ['sʌnɪnlɔ:] *n (pl* **sons-** [sʌnz-]) kürəkən, qızının əri

**sonnet** ['sɔnɪt] *n* sonet *(iki mürəbbe və iki müsəddəsdən ibarət olan on dörd misralı şer);* **Shakespeare's ~s** Şekspirin sonetləri

**sonny** ['sʌnɪ] *n d.d.* oğul *(müraciət forması)*

**sonority** [sə'nɔrətɪ] *n* **1.** gurluq, ucalıq *(səsdə)*; ahəngdarlıq, melodiklik; **2.** təntənə, dəbdəbə, təmtəraq; əzəmət, ehtişam; **3.** *fon.* cingiltililik

**sonorous** ['sɔnərəs] *adj* **1.** gur, uca, gur/uca səsli; ahəngdar, melodik; **a ~ voice** gur/uca/melodik səs; **2.** təntənəli; **a ~ style** təntənəli üslub

**sonorously** ['sɔnərəslɪ] *adv* təmtəraqla, dəbdəbə ilə; **to speak ~** təmtəraqla danışmaq

**soon** [su:n] *adv* **(-er, -est) 1.** tezliklə; *We'll soon be (at) home Biz tezliklə evdə olacağıq;* **2.** tez, vaxtsız, vaxtından əvvəl; *You spoke about it too soon Sən/Siz bu barədə çox tez/vaxtından əvvəl danışdın/ danışdınız; The sooner the better Nə qədər tez olsa, o qədər yaxşıdır;* **3.** həvəslə; məmnuniyyətlə; *I would just as soon stay at home Mən də məmnuniyyətlə evdə qalardım;*

◊ **as ~ as, so ~ as** elə ki; **sooner or later** nəhayətdə, gec-tez; bir vaxt/zaman

**soot** [sut] *n* qurum, his; *Sweep the soot out of the chimney Buxarını qurumdan təmizlə/təmizləyin*

**soothe** [su:ð] *v* **1.** sakitləşdirmək, sakit/rahat/təskin etmək; **to ~ a crying baby** ağlayan körpəni sakitləşdirmək/sakit etmək; **2.** yüngülləşdirmək, azaltmaq; **to ~ pain** ağrını yüngülləşdirmək; **3.** razı salmaq, kefini açmaq, könlünü almaq

**soother** ['su:ðəʳ] *n* boş əmzik

**soothing** ['su:ðɪŋ] *adj* sakitləşdirici, təsəlliverici; yüngülləşdirici; **~ music** sakitləşdirici musiqi; **a ~ voice** sakitləşdirici səs; **a ~ massage** yüngülləşdirici masaj

**soothingly** ['su:ðɪŋlɪ] *adv* nəzakətlə, mehribancasına; sakitedici bir tərzdə, sakitləşdirici bir surətdə

**soothsayer** ['su:θseɪəʳ] *n* qabaqcadan xəbər verən, gələcəkdən xəbərverən adam

**sooty** ['su:tɪ] *adj* hisli, his basmış, qurumlu, qurum tutmuş; **~ fog** hisli/his qarışmış duman

**sop¹** [sɔp] *n* **1.** suya və s. batırılmış parça/tikə *(çörək və s.)*; **2.** rüşvət; tulapayı; dilənçipayı; **to throw a ~ to *smb*.** bir kəsə tulapayı vermək

**sop²** [sɔp] *v* **(-pp-) 1.** islatmaq; batırmaq, salmaq; **2.** hopdurmaq; *Sop up the water with a paper towel Suyu kağız dəsmalla hopdur/hopdurun;* **3.** *d.d.* rüşvət vermək

**sophism** ['sɔfɪzm] *n* sofizm, sofistika

**sophist** ['sɔfɪst] *n* sofist *(düzgün olmayan fikirləri sofizmlə sübut etməyə çalışan adam)*

**soppy** ['sɔpɪ] *adj d.d.* **1.** yaş; **2.** yağışlı; yağmurlu; **~ weather** yağışlı/yağmurlu hava; **3.** gic, axmaq, sarsaq;

◊ **a ~ boy** ana uşağı, ərköyün uşaq

**soprano** [sə'pra:nou] *n (pl* **-os** [-nouz]) *mus.* soprano *(1) ən zil qadın səsi; 2) bu cür səsi olan qadın)*

**sorcerer** ['sɔ:sərəʳ] *n* cadugər, sehrbaz, ovsunçu

**sorcery** ['sɔ:sərɪ] *n* cadugərlik, sehrbazlıq, ovsunçuluq; cadu, ovsun

**sordid** ['sɔ:dɪd] *adj* **1.** çox pis, çirkin, iyrənc, mənfur, murdar; **2.** alçaq, yaramaz; **a ~ affair** yaramaz iş; **3.** çirkli, irinli; **~ wound** irinli yara

**sore¹** [sɔ:ʳ] *n* **1.** yara, sızanaq; irinlik; **2.** yaralı yer

**sore²** [sɔ:ʳ] *adj* **1.** xəstə; **a ~ tooth** xəstə diş; *I've got a sore throat Mənim boğazım xəstədir/ağrıyır;* **2.** qəmli, dərdli, kədərli, iztirablı; acınacaqlı; **~ sight** acınacaqlı mənzərə; **3.** gərgin, ağır; **~ struggle** ağır döyüş/toqquşma; **~ news** ağır xəbər;

◊ **to touch *smb*. on a ~ place** bir kəsin ağrılı yerinə toxunmaq, bir kəsin qabarını bastalamaq

**sorely** ['sɔ:lɪ] *adv* **1.** amansızcasına, qəddarcasına; əzabla, əziyyətlə; kobudcasına; **2.** çox, bərk; **to feel ~ inclined to do *smth*.** bir şeyi etməyi çox istəmək

**sorrel** ['sɔrəl] *n bot.* turşəng, quzuqulağı

**sorrow¹** ['sɔrou] *n* **1.** dərd, qəm, qüssə, kədər; hüzn, ələm; **keen ~** dərin kədər/hüzn/qüssə; **to be a ~ to *smb*.** bir kəsə dərd olmaq; **2.** təəssüf, acıma, ürəyi yanma, heyfsilənmə; **to express ~ at/for *smth*.** bir şeyə görə təəssüfünü bildirmək/ifadə etmək; **to feel ~ for *smb./smth*.** bir kəsə/bir şeyə təəssüflənmək; **the Man of Sorrows** İsa

**sorrow²** ['sɔrou] *v* qüssələnmək, kədərlənmək, qəm/ dərd çəkmək; təəssüf etmək; **to ~ for *smb*.** bir kəs üçün qüssələnmək; **to ~ over *one's* child's death** uşağının ölümündən qüssələnmək/kədərlənmək/dərd çəkmək

**sorrowful** ['sɔroufl] *adj* **1.** dərdli, kədərli, qüssəli; **a ~ face** dərdli/qüssəli/kədərli sifət; **a ~ look** kədərli/ qüssəli baxış; **a ~ song** kədərli/qüssəli mahnı; **a ~ tale** kədərli hekayət; **2.** hüznlü, təəssüfə layiq; **~ accident** təəssüfə layiq hadisə

**sorrowfully** ['sɔroufəlɪ] *adv* qəmli-qəmli, həzin-həzin; qüssəli; qəmli; **to sing a song ~** qəmli-qəmli/həzin-həzin mahnı oxumaq; *He shook his head sorrowfully O, başını qəmli-qəmli silkələdi*

**sorry** ['sɔrɪ] *adj* **(-ier, -iest) 1.** qəmli, kədərli; dərdli, qüssəli, ovqatı təlx, pərt, dilxor; **to be ~** kədərli/dərdli/qəmli/qüssəli olmaq; *We were very sorry to hear of your father's death Biz sənin/sizin atanın/atanızın ölümündən çox kədərləndik; I'm sorry Bağışlayın, günahkaram;* **to be ~ about *smth*.** bir şey haqqında təəssüflənmək; **2.** yazıq, bədbəxt, zavallı, biçarə, aciz, zəlil, binəva, miskin; **a ~ fellow** yazıq/aciz/zavallı adam

**sort¹** [sɔ:t] *n* növ, cür; **all ~s of things** hər növ/cür şeylər; *What sort of a man is he? O nə cür adamdır?*



**sort²** [sɔ:t] *v* çeşidləmək, seçmək; növlərə ayırmaq; siniflərə ayırmaq/bölmək *(adət.* **to ~ out/over)**; **to ~ out apples** almaları çeşidləmək/seçmək; *He had sorted out the best apples for eating O, almaların ən yaxşılarını yemək üçün seçmişdi*

**sorter** ['sɔ:təʳ] *n* çeşidləyici, malı növlərə/sortlara ayıran fəhlə/maşın

**sought** [sɔ:t] **to seek** *felinin pt, pp formaları*

**soul** [soul] *n* **1.** qəlb, ürək; *That man has no soul O kişinin əsla qəlbi/ürəyi yoxdur;* **with all my ~** bütün qəlbimlə; **2.** mahiyyət, əsas, özül; ayrılmaz keyfiyyət; *Discipline is the soul of the army Nizam-intizam ordunun əsasıdır;* **3.** adam; *There were 300 souls on board Gəmidə 300 adam vardı;* **poor ~** yazıq, fağır, biçarə, zavallı; **simple ~** sadədil, sadəlövh, sadə *(adam)*;

◊ *(Upon) my soul And içirəm! Allaha and olsun!*

**sound¹** [saund] *n* **1.** səs; *Not a sound was heard Heç bir səs eşidilmədi;* **2.** küy, səs-küy; **the ~ of the wind/of the sea** küləyin/ dənizin səs-küyü; **3.** *fon.* səs; **vowel ~s** sait səslər; **consonant ~s** samit səslər

**sound²** [saund] *adj* **1.** sağlam, möhkəm; **~ teeth** sağlam/möhkəm dişlər; **2.** bərk, sakit *(yuxu haq.)*; **3.** saz; **a ~ machine** saz maşın; **4.** ağıllı, ağlabatan, məntiqə uyğun; **~ argument** ağıllı/ağlabatan arqument/ dəlil; **~ judgement** məntiqə uyğun mühakimə;

◊ *A sound mind in a sound body Sağlam bədəndə sağlam ruh olar*

**sound³** [saund] *v* **1.** səslənmək, səs vermək/çıxartmaq; *This music sounds beautifully Bu musiqi gözəl səslənir; The explanation sounds all right İzahat tamam düzgün səslənir;* **2.** xəbər vermək, elan etmək, bildirmək; **3.** oxumaq; *"H" in "hour" is not sounded "Hour" sözündə "h" hərfi oxunmur*

**soundly** ['saundlɪ] *adv* **1.** əsaslı, əsaslı surətdə /tərzdə, ağılla, bacarıqla; *He reasons soundly O, ağılla mühakimə yürüdür;* **2.** bərk *(yuxu haq.)*; **to sleep ~** bərk yatmaq; *He slept soundly all the night O bütün gecəni bərk yatdı;* **3.** tam, tamam; *They were soundly defeated Onlar tam/tamam məğlub edildilər/oldular*

**sound meter** ['saund,mi:təʳ] *n* səsölçən *(cihaz)*

**soundness** ['saundnɪs] *n* **1.** sağlamlıq; **2.** möhkəmlik, bərklik; **the ~ of the foundation** özülün/bünövrənin möhkəmliyi; **3.** ağıllılıq, məntiqlilik, ağlabatanlıq; **the ~ of judgement** mühakimənin məntiqliliyi/ ağlabatanlığı

**sound-proof** ['saundpru:f] *adj* səskeçirməyən, səsudan

**sound-shifting** ['saund,ʃɪftɪŋ] *n dilç.* səsdəyişmə

**soup** [su:p] *n* şorba, sup; **cabbage ~** kələm supu/ şorbası, şi; **fish ~** balıq şorbası/supu, uxa; **chicken ~** cücə/çolpa şorbası; **vegetable ~** tərəvəz şorbası/supu

**soup-plate** ['su:pppleɪt] *n* dərin boşqab, şorba/sup boşqabı

**soup-spoon** ['su:pspu:n] *n* xörək qaşığı

**sour¹** [sauəʳ] *n* turşu, zəy *(çox turş şey mənasında)*

**sour²** [sauəʳ] *adj* **1.** turş; **a ~ apple** turş alma; **2.** çürümüş *(süd haq.)*; **~ cream** xama; **3.** narazı, tutqun; kədərli, qaşqabaqlı; **~ looks** narazı/qaşqabaqlı görkəm

**sour³** [sauəʳ] *v* **1.** turşumaq; *The hot weather soured the milk İsti hava südü turşutdu;* **2.** kədərlənmək, narazı olmaq, tutulmaq

**source** [sɔ:s] *n* **1.** çayın başlanğıcı/mənbəyi/başı; **the ~ of a river** çayın mənbəyi; *Where is the source of the Rhine? Reyn çayının başlanğıcı haradadır?* **2.** bulaq, çeşmə; qaynaq; **3.** səbəb; **~ of a joy/of an infection** sevincin/infeksiyanın səbəbi; **4.** yazılı mənbə; sənəd; **historical ~s** tarixi mənbələr/sənədlər; **original/ primary ~s** ilkin/birinci mənbələr

**sourish** ['sauərɪʃ] *adj* **1.** turştəhər, turşməzə; **a ~ apple** turşməzə alma; **2.** deyingən, daim donquldanan; **a ~ person** deyingən adam

**sourness** ['sauənɪs] *n* **1.** turşuluq, turş dad; **2.** *kim.* turşuluq dərəcəsi

**sour-sweet** ['sauəswi:t] *adj* turşaşirin

**souse¹** [saus] *n* atılma, hoppanma, tullanma *(suya)*; batma, dalma; **to give a ~** dalmaq, cummaq, baş vurmaq *(suya)*

**souse²** [saus] *v* **1.** batırmaq, basmaq, daldırmaq *(suya)*; **to be ~d (over) head and ears in cold water** soyuq suya batmaq/atılmaq; **2.** islatmaq, sulamaq; **3.** tökmək, sıçratmaq *(suyu və s.)*

**south¹** [sauθ] *n (qısa forması* S) **1.** cənub, güney; **2. (the South)** cənub/güney ölkələr, ABŞ-ın cənub ştatları

**south²** [sauθ] *adj* cənub; **a ~ wind** cənub küləyi

**south³** [sauθ] *adv* cənuba, cənub tərəfə; *Some birds fly south for winter Bəzi quşlar qışlamaq üçün cənuba uçur;* **to go down ~ for a few days** bir neçə günlük cənuba getmək

**southbound** ['sauθbaund] *adj* cənuba gedən; **a ~ train** cənuba gedən qatar

**southerly¹** ['sʌðəlɪ] *n* cənub küləyi; **warm southerlies** mülayim cənub küləkləri

**southerly²** ['sʌðəlɪ] *adj* cənub; **~ winds** cənub küləkləri; **~ direction** cənub istiqaməti

**southerly³** ['sʌðəlɪ] *adv* cənuba, cənub istiqamətində; *The plane flew off southerly Təyyarə cənuba/cənub istiqamətində uçdu*

**southern** ['sʌðən] *adj* cənub, cənubi; **the Southern states of the USA** ABŞ-ın cənub ştatları; **~ Europe** Cənubi Avropa

**southpaw** ['sauθpɔ:] *n* solaxay adam *(xüs. boksçu haq.)*

**southward** ['sauθwəd] *adv* = **southwards**

**southwards** ['sauθwədz] *adv* cənuba, cənuba tərəf, cənub istiqamətində; **a ship sailing ~** cənuba (tərəf) üzən gəmi

**souvenir** [ˌsu:və'nɪə^r] *n* suvenir, yadigar, yadigar üçün verilən şey; **to give** *smb.* **a ~** bir kəsə suvenir vermək

**sovereign**[1] ['sɔvrɪn] *n* 1. suveren *(hakimiyyəti təmsil edən)*, padşah, hökmdar, əmir; 2. soveren *(qədim Britaniya qızıl sikkəsi)*

**sovereign**[2] ['sɔvrɪn] *adj* 1. ali, yüksək; **~ power** ali hakimiyyət; 2. qeyri-məhdud, mütləqiyyətə əsaslanan, monarxiya, külli-ixtiyar, tam hakim; 3. suveren, müstəqil; **a ~ state** suveren/müstəqil dövlət

**sovereignty** ['sɔvrəntɪ] *n* 1. müstəqillik, suverenlik; **national ~** milli suverenlik/müstəqillik; **state ~** dövlət suverenliyi/müstəqilliyi; **to encroach upon** *smb's* **~** bir kəsin müstəqilliyinə toxunmaq/əl uzatmaq/qəsd etmək; 2. ali hakimiyyət; 3. hökmranlıq

**Soviet**[1] ['souvɪet] *n* sovet *(köhnə SSRİ-də hakimiyyət orqanı)*

**Soviet**[2] ['souvɪet] *adj* sovet; **the ~ Union** Sovet İttifaqı; **~ Russia** sovet Rusiyası

**sow**[1] [sau] *n* donuz, ana donuz

**sow**[2] [sou] *v* (*pt* **sowed**; *pp* **sown** [soun] *və ya* **sowed**) 1. səpmək; **to ~ wheat/barley** buğda/arpa səpmək; 2. *məc.* yaymaq; intişar etdirmək; səpmək; **to ~ the seeds of enmity/of hatred** düşmənçilik/nifrət toxumu səpmək;
◊ **to ~ dragon's teeth** nifaq salmaq, müharibə törətmək; **to ~ wind and to reap the whirlwind** *at. söz.* ≅ *Özgəsinə quyu qazan özü düşər*

**sower** ['souə^r] *n* 1. səpən, səpinçi; 2. toxumsəpən *(maşın)*

**sowing-machine** ['souɪŋməˌʃi:n] *n* = **sower** *(2-ci mənada)*

**sown** [soun] **to sow** *felinin pp forması*

**soya-bean** ['sɔɪəbi:n] *n* = **soy-bean**

**soy-bean** ['sɔɪbi:n] *n bot.* soya *(paxla fəsiləsindən birillik bitki)*

**sozzled** ['sɔzld] *adj* bərk kefli/sərxoş

**spa** [spa:] *n* 1. mineral su bulağı/qaynağı; 2. mineral suyu olan kurort; **to go to ~ for a cure** müalicə üçün mineral suyu olan kurorta getmək

**space**[1] [speɪs] *n* 1. məsafə; **a ~ of one kilometre** bir kilometr məsafə; 2. sahə, yer; *The piano takes too much space Piano lap çox yer tutur*; 3. *fəls.* məkan; **~ and time** məkan və zaman; 4. ara, interval; **a wide ~ between the rows** cərgələr arasında geniş yer; 5. müddət; **a ~ of three years** üçillik müddət; **within the ~ of ten years** on il müddətində; 6. kosmos, kainat, dünya *(həm də* **outer ~***)*; **open ~** açıq kosmos/kainat

**space**[2] [speɪs] *adj* kosmik; **the ~ age** kosmik əsr; **~ science** kosmos haqqında elm; **~ biology/ chemistry** kosmik biologiya/kimya **~ centre** kosmik mərkəz; **~ dust** kosmik toz; **a ~ laboratory** kosmik laboratoriya; **~ sickness** kosmik xəstəlik; **a ~ missile** kosmik raket; **~ station** kosmik stansiya; **~ travel** kosmik səyahət

**space**[3] [speɪs] *v* 1. ara qoymaq; *Space out the posts three metres apart Dirəklərin arasında üç metr ara qoy/qoyun*; 2. *poliqr.* aralı yığmaq *(hərfləri)*

**spacecraft** ['speɪskra:ft] *n* kosmik gəmi

**spaceman** ['speɪsmæn] *n* (*pl* **-men** [-mən]) 1. kosmonavt; astronavt *(astronavtika mütəxəssisi)*; 2. başqa planetdən gələn adam

**spaceship** ['speɪsʃɪp] *n* = **spacecraft**

**spacious** ['speɪʃəs] *adj* geniş, tutumlu; **a ~ hall** geniş zal; **a very ~ kitchen** çox geniş mətbəx

**spaciousness** ['speɪʃəsnɪs] *n* genişlik, tutumluluq

**spade**[1] [speɪd] *n* I bel, kürək; **a garden ~** bağ beli

**spade** [speɪd] *n* II qaratoxmaq *(qumar kağızında)*

**spade**[2] [speɪd] *v* belləmək; **to ~ a garden** bağ belləmək

**spadeful** ['speɪdful] *adj* (*pl* **-fuls**) bel dolusu; **three ~s of sand** üç bel (dolusu) qum

**spadework** ['speɪdwə:k] *n* 1. ağır/çox zəhmət tələb edən hazırlıq işi; 2. qara iş

**span**[1] [spæn] *n* 1. interval; zaman müddəti; **a person's average life ~** insanın orta ömür/həyat müddəti; 2. bir qurtaracaqla o biri qurtaracaq arasında olan məsafə; en *(çay və s. haq.)*; 3. yaddaşın tutumu; 4. körpünün dayaqları/tağları arasında olan məsafə; *The arch has a span of 60 metres Tağların arasında 60 metr məsafə var*; 5. qarış, uzunluq ölçüsü (22,8 sm)

**span**[2] [spæn] *v* (**-nn-**) 1. üstünü örtmək/basdırmaq *(evin damı və s. haq.)*; 2. körpü salmaq; sahilləri birləşdirmək *(körpü ilə)*; 3. keçmək; **to ~ a river** çayı keçmək; 4. qarışla ölçmək; 5. ölçmək; *His eyes spanned the space O, gözü ilə məsafəni ölçdü*

**Spaniard** ['spænjəd] *n* 1. ispaniyalı; **the ~(s)** ispanlar; 2. ispan bayrağı altında üzən gəmi

**Spanish**[1] ['spænɪʃ] *n* 1. ispan dili; *Do you speak Spanish? Sən/Siz ispanca danışırsanmı? /danışırsınızmı?* 2.: **the ~** *top.i* ispanlar

**Spanish**[2] ['spænɪʃ] *adj* ispan; **~ dancing** ispan rəqsi

**spank**[1] [spæŋk] *n* şapalaq

**spank**[2] [spæŋk] *v* şapalaqlamaq, şapalaq vurmaq; *We never spank our children Biz uşaqlarımızı heç vaxt şapalaqlamırıq*

**spanking** ['spæŋkɪŋ] *n* şapalaqlama; *That boy deserves a good spanking O oğlan yaxşıca şapalaqlanmağa layiqdir*

**spanner** ['spænə^r] *n* qayka açarı;
◊ **to throw a ~ in the works** ≅ işə mane olmaq/ əngəl törətmək

**spare**[1] [speə^r] *n* 1. ehtiyat hissə *(maşının və s.)*; 2. *id.* ehtiyat oyunçu

**spare**[2] [speə^r] *adj* 1. ehtiyat, əlavə; **~ parts** ehtiyat hissələr; 2. əlavə, artıq; *I've some spare copies Məndə əlavə/artıq bir neçə nüsxə var*; **a ~ room** 1) əlavə otaq; 2) qonaq otağı; **~ time** əlavə vaxt; 3. arıq, nazik; **a tall ~ body** hündür arıq bədən



**spare**[3] [speə^r] *v* 1. qorumaq, saxlamaq, qənaət edib/qoruyub saxlamaq; **to ~ *one's* strength** gücünü qoruyub saxlamaq; 2. əsirgəmək, heyfi gəlmək; **to ~ neither trouble nor expence** nə zəhmət, nə də xərc əsirgəmək; 3. keçinmək *(bir şeysiz)*; 4. ayırmaq; *Can you spare me a few minutes? Sən/Siz mənə bir neçə dəqiqə ayıra bilərsənmi?/bilərsinizmi?*
◊ **enough and to ~** lazım olduğundan artıq /çox; **to ~ the rod and spoil the child** ≅ qaş düzəltmək əvəzinə göz çıxartmaq

**spark**[1] [spa:k] *n* 1. qığılcım; *Sparks from the fire were flying up the chimney Ocaqdan çıxan qığılcımlar bacadan uçurdu*; 2. iz, əlamət; *He has not a spark of wit Onda ağıl deyilən şeyin əlaməti yoxdur*;
◊ **as the ~s fly upward** labüddən, mütləq, istər-istəməz; **the vital ~, the ~ of life** həyat qığılcımı/ işartısı

**spark**[2] [spa:k] *v* 1. qığılcımlanmaq, qığılcım saçmaq; *The fire is sparking dangerously Ocaq təhlükəli şəkildə qığılcım saçır*; 2. qızışdırmaq, alovlandırmaq; *His comment sparked off a quarrel between them Onun izahatı/şərhi onlar arasında mübahisəni qızışdırdı*

**sparkle**[1] ['spa:kl] *n* 1. zəif/kiçik qığılcım; 2. parıltı, işıltı; 3. əlamət, işarantı; **not a ~ of wit** ağıl işarantısı olmama; 4. parlama, parıldama, işıldama; 5. canlılıq, zirəklilik, çeviklik, şuxluq

**sparkle**[2] ['spa:kl] *v* 1. qığılcımlanmaq, qığılcım saçmaq; parlamaq; *Her eyes were sparkling with joy Onun gözləri sevincdən parlayırdı*; 2. köpüklənmək *(şərab haq.)*; 3. bərq vurmaq, parıldamaq; *Her diamonds sparkled in the candlelight Onun brilyantları şam işığında bərq vurdu/parladı*; 4. seçilmək, fərqlənmək; *She always sparkles at parties O, həmişə qonaqlıqlarda fərqlənir/seçilir*

**sparkler** ['spa:klə^r] *n* 1. Benqal fişəngi; 2. hazırcavab adam; 3. cazibəli/cazibədar/ cəzbedici /məlahətli qadın

**sparkling** ['spa:klɪŋ] *adj* 1. parıldayan, bərq vuran; **the ~ blue water of the sea** dənizin bərq vuran mavi suyu; 2. *məc.* çox yaxşı/gözəl; təmtəraqlı, dəbdəbəli; **a ~ conversation** təmtəraqlı söhbət; 3. cazibədar, cazibəli, məlahətli; **a ~ young woman** cazibədar/ məlahətli gənc qadın; 4. köpüklənən; **~ wine** köpüklənən şərab/çaxır

**sparrow** ['spærou] *n zool.* sərçə

**sparse** [spa:s] *adj* seyrək; **~ beard/hair** seyrək saqqal/ saç

**sparsely** ['spa:slɪ] *adv* arabir, aralı, seyrək; **a ~ populated region** seyrək məskunlaşmış rayon /bölgə

**sparseness** ['spa:snɪs] *n* seyrəklik, aralılıq

**spartan** ['spa:tn] *n* spartalı *(qədim yunan dövləti Sparta vətəndaşı)*

**spasm** [spæzm] *n* spazma, cəng, cəng/qıc olma; **muscular ~s** əzələ spazmaları

**spasmodic** ['spæz'mɔdɪk] *adj* 1. spazmatik; spazmalı; **~ coughing** spazmatik öskürək/öskürmə; **~ pain** spazmatik ağrı; 2. qeyri-müntəzəm; qarışıq, qarma-qarışıq, nizamsız; *The attacks were spasmodic and ineffective Hücumlar qeyri-müntəzəm və təsirsiz idi*

**spasmodically** ['spæz'mɔdɪklɪ] *adv* ara-sıra, hərdənbir, gahdanbir, hərdən-hərdən, hərdən-birdən

**spastic** ['spæstɪk] *adj tib.* spazmalı, spazmatik; **~ children** spazmalı uşaqlar

**spat**[1] [spæt] *n* kiçik narazılıq, küsmə, incimə; **a ~ between brother and sister** qardaş-bacı arasında incimə/ küsmə

**spat**[2] [spæt] **to spit** *felinin pt, pp formaları*

**spate**[1] [speɪt] *n* 1. daşqın, suyun qalxması/daşması; *The river is in spate Çay daşır*; 2. leysan, güclü/şiddətli yağış; 3. axın; **a ~ of words** söz axını

**spate**[2] [speɪt] *v* 1. daşmaq *(çay haq.)*; 2. yağmaq *(yağış haq.)*

**spatial** ['speɪʃl] *adj* 1. məkan, müəyyən məkanda yerləşən, məkanda mövcud olan; *We are temporal and spatial Biz zaman və məkanda mövcuduq*; 2. kosmik; **~ flights** kosmik uçuşlar; **~ objects** kosmik obyektlər

**spatially** ['speɪʃəlɪ] *adv* məkanca, məkani, məkan baxımından

**spatter**[1] ['spætə^r] *n* 1. səpinti, sıçrantı, damcı; 2. yüngül/zəif yağış *(həm də* **a ~ of rain***)*

**spatter**[2] ['spætə^r] *v* 1. sıçratmaq, fışqırtmaq; səpmək, çiləmək; **to ~ mud on *one's* clothes** paltarına palçıq sıçratmaq; *As the bus passed, it spattered us with mud Avtobus keçəndə üstümüzə palçıq sıçratdı*; 2. ləkələmək, bədnam etmək; **to ~ a man's good name** bir adamın təmiz/yaxşı adını ləkələmək, bir kəsi bədnam etmək

**spawn**[1] [spɔ:n] *n* kürü *(balığın və s.)*

**spawn**[2] [spɔ:n] *v* 1. kürü tökmək *(balıq və s.)*; *The salmon swims up-river to spawn Qızılbalıq kürü tökmək üçün çayyuxarı üzür*; 2. çoxalmaq, doğmaq, törəmək, doğub törəmək, artıb çoxalmaq

**spay** [speɪ] *v* axtalamaq, burmaq *(heyvanları)*

**speak** [spi:k] *v* (*pt* **spoke** [spouk]; *pp* **spoken** ['spoukən]) danışmaq; **to ~ English** ingiliscə danışmaq; *The baby doesn't speak yet Uşaq hələ danışmır; He can speak now İndi o danışa bilir; She spoke at last Nəhayət o danışdı; I'll speak to him Mən onunla danışacam*; **to ~ at the meeting** iclasda danışmaq; **to ~ the truth** həqiqəti danışmaq; **to ~ out** 1) aydın danışmaq; 2) açıq danışmaq

**speaker** ['spi:kə^r] *n* 1. danışan; *I looked round to see who the speaker was Mən danışanın kim olduğunu bilmək üçün ətrafa boylandım; The voice of the speakers in the next room could be faintly heard Qonşu otaqda danışanların səsi güclə eşidilirdi*; 2. natiq; **the first ~** birinci natiq; *The party leader is a very good speaker Partiyanın başqanı/rəhbəri çox yaxşı natiqdir*; 3. diktor; 4. spiker *(parlamentin sədri)*

**speaking**[1] ['spi:kıŋ] *n* danışıq, nitq; **plain ~** açıq/təmiz danışıq

**speaking**[2] ['spi:kıŋ] *adj* 1. danışan; danışmağı bacaran, danışmaq iqtidarında olan; 2. ifadəli, mənalı; **~ face/eyes** mənalı sifət/gözlər; **~ glance** mənalı/ifadəli baxış;

◊ **to be on ~ terms** dostluq etmək, danışmaq; *We are no longer on speaking terms Biz çoxdandır ki, danışmırıq, Biz küsüşmüşük*

**spear**[1] [spıəʳ] *n* 1. nizə, mizraq, cida; 2. *bot.* cücərti; zoğ, cavan budaq

**spear**[2] [spıəʳ] *v* 1. nizə ilə/mizraqla/cida ilə deşmək/sancmaq/dəlmək; 2. çəngəl *(balıq tutmaq üçün yaba şəklində alət)* atmaq; 3. sancılmaq, batmaq

**spearman** ['spıəmən] *n (pl* **-men** [-mən]) 1. nizəli/mizraqlı əsgər; 2. silahdaşıyan

**special**[1] ['speʃl] *n d.d.* 1. təcili/çox tələsik buraxılış; 2. təcili qatar; 3. xüsusi müxbir; 4. təcili məktub; 5. **(the ~)** xüsusi; **from the general to the ~** ümumidən xüsusiyə

**special**[2] ['speʃl] *adj* 1. xüsusi, ayrı, ayrıca; **a ~ interest/reason/occasion** xüsusi maraq/səbəb/hal; **a ~ friend** xüsusi dost; *What is your special interest? Sənin/Sizin xüsusi marağın/marağınız nədir?*; 2. əlavə; **a ~ train** əlavə qatar, xüsusi məqsədli qatar; 3. fərdi; **~ feature** fərdi əlamət; 4. müəyyən; **a ~ day/place** müəyyən gün/yer

**specialist** ['speʃəlıst] *n* mütəxəssis; **an eye ~** göz xəstəlikləri üzrə mütəxəssis, göz həkimi

**speciality** [ˌspeʃı'ælıtı] *n* 1. sənət, peşə; ixtisas; **to make a ~ of *smth.*** hər hansı bir sahədə ixtisaslaşmaq; *What's your speciality Sənin/Sizin sənətin/sənətiniz nədir?*; 2. fərqləndirici/fərdi xüsusiyyət; 3. *pl* təfərrüat, təfsilat; **to leave out the specialities** təfərrüata varmamaq

**specialization, -isation** [ˌspeʃəlaı'zeıʃn] *n* ixtisaslaşma, ixtisaslaşdırma

**specialize, -ise**[1] ['speʃəlaız] *v* 1. ixtisaslaşmaq; *He specializes in Oriental History O, şərq tarixi üzrə ixtisaslaşır*; 2. dəqiqləşdirmək, müəyyənləşdirmək; detallaşdırmaq, təfsilatı/ təfərrüatı ilə danışmaq; 3. məhdudlaşdırmaq, daraltmaq

**specially** ['speʃəlı] *adv* 1. xüsusilə, xüsusən, ələlxüsus; **to be ~ careful** xüsusilə diqqətli olmaq; 2. xüsusi olaraq, məxsusən; *I went there specially to see her Mən ora xüsusilə onu görmək üçün getdim*

**species** ['spi:ʃi:z] *n (cəmdə dəyişmir)* 1. cins, nəsil; **the ~, our ~** insan nəsli; **progress of the ~ in science** insan nəslinin/bəşəriyyətin elm sahəsində nailiyyəti; 2. növ; **mineral ~** minerallarn növləri; *Blackmail is a species of crime Şantaj cinayətin bir növüdür*

**specific** [spı'sıfık] *adj* 1. xüsusi, ayrıca, ələhiddə; **a ~ use of a word** sözün xüsusi/ələhiddə işlənməsi; **in each ~ case** hər bir ayrıca halda; 2. xarakterik, səciyyəvi; **~ distinction/symptom** səciyyəvi fərq/əlamət

**specification** [ˌspesıfı'keıʃn] *n* 1. təyin/müəyyən etmə, spesifikasiya *(bir şeyin səciyyəvi xüsusiyyətlərinin müəyyən edilməsi)*; 2. dəqiqləşdirmə, müəyyənləşdirmə, dürüstləşdirmə; 3. təfsilat, təfərrüat

**specified** ['spesıfaıd] *adj* dəqiq müəyyənləşdirilmiş, dəqiqləşdirilmiş, ətraflı; **~ list** dəqiqləşdirilmiş siyahı; **~ data** dəqiqləşdirilmiş dəlillər

**specify** ['spesıfaı] *v (pt, pp* **-fied**) 1. tam dəqiqləşdirmək/müəyyən etmək; 2. şərt qoymaq, asılı etmək, şərtləşdirmək; *He specified that it should be done early in the morning O, şərt qoydu ki, bu, səhər tezdən edilsin*; 3. xüsusi olaraq qeyd etmək/yada salmaq/göstərmək; 4. səciyyəvi/spesifik xüsusiyyətləri göstərmək

**specimen**[1] ['spesımın] *n* 1. nümunə, örnək; nüsxə; **the finest ~s in his collection** onun kolleksiyasında ən gözəl nümunələr; *There were some fine speciemens of fossils in the museum Muzeydə bir neçə gözəl qazıntı nümunələri vardı*; 2. qəribə adam

**specimen**[2] ['spesımın] *adj* nümunəvi; nümunə; **~ copy** nümunəvi nüsxə; **~ work** nümunəvi iş; **~ page** nümunə səhifə

**specious** ['spi:ʃəs] *adj* 1. yalançı, saxta, aldadıcı, etibarsız; **a ~ argument** saxta/aldadıcı dəlil; 2. cəzbedici; *This plan though specious was impracticable Bu plan cəzbedici olsa da, həyata keçirilən deyildi*

**speck** [spek] *n* 1. balaca ləkə; *Not a speck of dirt anywhere Heç yerdə (bir) ləkə yox idi*; 2. hissəcik; dənəcik; **a ~ of salt** duz dənəciyi; 3. zərrə; **a ~ of truth** bir zərrə həqiqət;

◊ **to dwindle to ~s** yox etmək, həddən artıq azaltmaq

**speckle** ['spekl] *n* 1. ləkə; **brown ~s on white eggs** ağ yumurtalar üzərində palıdı ləkələr; 2. çil

**speckled** ['spekld] *adj* 1. çil-çil, çilli; **a ~ dress** çil-çil paltar; **a ~ stone** çil-çil/çilli daş; 2. xal-xal, xallı; **a ~ deer** xallı maral; **a ~ hen** çil/çil-çil toyuq

**speckless** ['speklıs] *adj* 1. ləkəsiz, təmiz, tərtəmiz; 2. ləkələnməmiş; eyibsiz, qüsursuz, nöqsansız

**spectacle** ['spektəkl] *n* 1. mənzərə, səhnə; **a moving/ magnificent ~** təsirli/çox gözəl mənzərə; **sad ~** qəmli/kədərli mənzərə; *The sunrise seen from high in the mountain was a tremendous spectacle Dağın yüksəkliyindən günəşin doğmasının görünüşü çox gözəl bir mənzərə idi*; **to make a ~ of oneself** 1) hamının diqqətini özünə cəlb etmək; 2) gülünc vəziyyətə düşmək; 2. tamaşa, teatr tamaşası

**spectacle-case** ['spektəklkeıs] *n* eynək/çeşmək /gözlük qabı

**spectacled** ['spektəkəld] *adj* çeşməkli, eynəkli; **a ~ man** eynəkli/çeşməkli adam



**spectacles** ['spektəklz] *n (ancaq cəmdə işlənir)* eynək, gözlük, çeşmək; **a pair of ~** bir eynək/çeşmək/gözlük

**spectacular**[1] [spek'tækjuləʳ] *n* parlaq teatr tamaşası

**spectacular**[2] [spek'tækjuləʳ] *adj* 1. əzəmətli, görkəmli, hörmət hissi doğuran; çox maraqlı, cəlbedici, heyranedici, valehedici; **a ~ display of fireworks** cəlbedici atəşfəşanlıq; 2. *teatr.* **a ~ display** teatr tamaşası

**spectator** [spek'teıtəʳ] *n* tamaşaçı; **noisy ~s at a boxing match** boks yarışında səs-küylü tamaşaçılar

**spectatress** [spek'teıtrıs] *n* qadın/qız tamaşaçı

**spectral** ['spektrəl] *adj* 1. şəffaf; 2. *fiz.* spektral; **~ analysis** spektral analiz; **~ colours** spektral rənglər

**spectre** ['spektəʳ] *n* 1. qarabasma, kabus, kölgə; 2. pis fikir; təhlükə; **the ~ of war/of disaster** müharibə/bədbəxtlik təhlükəsi

**spectrometer** [spek'trɔmıtəʳ] *n* spektrometr *(spektrin ayrı-ayrı xətlərinin vəziyyətini müəyyən etmək üçün cihaz)*

**spectroscope** ['spektrəskoup] *n* spektroskop *(spektrləri müşahidə etmək üçün cihaz)*

**spectroscopic** [ˌspektrə'skɔpık] *adj* spektroskopik; **~ analysis** spektroskopik analiz

**spectroscopy** [ˌspektrə'skɔpı] *n* spektroskopiya *(fizikanın spektrlər bəhsi)*

**spectrum** ['spektrəm] *n (pl* **spectra**) 1. *fiz.* spektor; **solar ~** günəş spektoru; 2. təsvir; surət; 3. diapazon; **the sound ~** səs diapazonu; **the ~ of knowledge** bilik diapazonu; 4. kabus, qarabasma, kölgə

**specular** ['spekjuləʳ] **speculum** *isminin cəm forması*

**speculate** ['spekjuleıt] *v* 1. fikirləşmək, düşünmək, götür-qoy etmək/eləmək; **to ~ about /upon the future** gələcək haqqında fikirləşmək; 2. möhtəkirlik/alver etmək, alverlə məşğul olmaq; **to ~ on papers** qiymətli kağızlarla möhtəkirlik/alver etmək

**speculation** [ˌspekju'leıʃn] *n* 1. fikirləşmə, düşünmə; götür-qoy etmə; *In consequence of these speculations he decided to stay Bu götür-qoyların nəticəsində o qalmağı qərara aldı*; 2. *fəls.* abstrakt fəlsəfi görüş, abstrakt mühakimə; 3. hipoteza, fərziyyə; ehtimal, güman; **pure ~** xalis güman/ehtimal; **to be the subject of much ~** çox fərziyyələrin/ehtimalların səbəbi olmaq; 4. ehtikarlıq, alver; **~ in rice** düyü alveri

**speculative** ['spekjulətıv] *adj* 1. *fəls.* spekulyativ, təcrübəyə əsaslanmayan, mücərrəd, abstrakt; **~ philosophy** spekulyativ fəlsəfə; 2. təfəkkür, düşünmə; **~ power** düşünmə gücü/qabiliyyəti; 3. nəzəri; hipotetik, fərziyyəyə əsaslanan; 4. ehtikar; **~ purchase** bazar qiymətinə alma; 5. qorxulu, xətərli, xatalı

**speculator** ['spekjuleıtəʳ] *n* 1. ehtikar, alverçi, spekulyant

**speculum** ['spekjuləm] *n (pl* **-la**) *fiz.* reflektor *(şüaları əks etdirən cihaz)*

**sped** [sped] **to speed** *felinin pt, pp formaları*

**speech** [spi:tʃ] *n* 1. nitq; **parts of ~** *dilç.* nitq hissələri; **freedom of ~** nitq azadlığı; *We express our thoughts through speech Biz fikirlərimizi nitq vasitəsilə ifadə edirik*; 2. nitq, çıxış; **an opening ~** giriş nitqi; **a closing ~** yekun nitqi; **to deliver/to make a ~** nitq söyləmək/irad etmək;

◊ *Speech is silver, silence is golden at. söz. Danışmaq gümüş, susmaq qızıldır*

**speechful** ['spi:tʃfl] *adj* 1. boşboğaz, çoxdanışan, çərənçi, naqqal; söhbətcil; 2. ifadəli, mənalı; **a ~ face** ifadəli sifət; **her ~ eyes** onun mənalı gözləri

**speechless** ['spi:tʃlıs] *adj* 1. lal; 2. dinməz, danışmaz, azdanışan; **a ~ woman** azdanışan qadın; **to be /to remain ~** susmaq, danışmamaq; 3. nitqi tutulmuş/ itmiş; **~ with rage/with fear/ with surprise** qəzəbdən/qorxudan/təəccübdən nitqi tutulmuş

**speech-maker** ['spi:tʃˌmeıkəʳ] *n* çıxış edən, natiq

**speech-sound** ['spi:tʃsaund] *n* nitq səsi

**speed**[1] [spi:d] *n* sürət; **at average/at great ~** orta/böyük sürətlə; **at full ~** tam sürətlə; **at/with lightning ~** ildırım sürətilə; **to put on ~** sürəti artırmaq

**speed**[2] [spi:d] *v (pt, pp* **sped** [sped] *və ya* **speeded** [-ıd]) 1. sürətlə getmək/keçib getmək/ötüb keçmək, cəld uçmaq/uçub getmək, çaparaq getmək; *An arrow sped past Bir ox sürətlə ötüb keçdi; The car sped along the road Maşın yolla sürətlə getdi; The years sped by İllər sürətlə ötüb/keçib getdi*; 2. tələsmək, tələsdirmək; *He took a taxi and sped to the station O, bir taksi tutdu və vağzala tələsdi*; **to ~ *one's* horse** atını tələsdirmək; 3. tezləşdirmək, sürət yığmaq; **to ~ *one's* steps** addımlarını tezləşdirmək; 4. sürəti tənzimləmək/idarə etmək; **to ~ a machine** maşının sürətini tənzimləmək/idarə etmək; **to ~ off** tələsik getmək; **to ~ up** tezləşdirmək; **to ~ up production** məhsul buraxılışını artırmaq

**speed-boat** ['spi:dbout] *n* sürət qayığı, sürətli qayıq

**speed-box** ['spi:dbɔks] *n tex.* sürət qutusu

**speed-counter** ['spi:dˌkauntəʳ] *n* = **speedometer**

**speed-limit** ['spi:dˌlımıt] *n* yol verilən sürət, sürətin limiti

**speedometer** [spı'dɔmıtəʳ] *n* spidometr *(avtomobildə və s. sürət ölçən cihaz)*

**speedway** ['spi:dweı] *n* 1. sürət yolu; 2. avtostrada *(ikitərəfli avtomobil yolu)*; 3. motosikl yarışı üçün yol

**speedy** ['spi:dı] *adj* 1. tez, iti, yeyin, cəld, sürətli, çevik; **~ hands** iti/cəld/çevik əllər; 2. təxirsiz, təcili, təxirəsalınmaz, yubadılmaz; **a ~ reply** təcili/ təxirəsalınmaz cavab

**spell**[1] [spel] *n* I 1. ovsun, cadu, sehr; 2. cazibə, ləta-

fət, məlahət; cazibədarlıq, füsunkarlıq, gözəllik; **to cast a ~ on/over** *smb.* bir kəsi məftun/heyran/valeh etmək; **under a ~** məftun/valeh olmuş; ovsunlanmış, tilsimlənmiş, cadulanmış; **to come under a ~** cadulanmaq, ovsunlanmaq, tilsimlənmək; **to break/to remove a ~** tilsimi sındırmaq/qırmaq, cadudan/ovsundan xilas olmaq

**spell** [spel] *n* II 1. müddət, vaxt; dövr; **a ~ of service** xidmət müddəti/vaxtı; **to do a ~ in prison** həbs müddətini başa vurmaq; **a good ~** xeyli müddət; **to take a pretty long ~ in town** şəhərdə xeyli vaxt keçirmək; 2. tutma *(xəstəlik)*; **coughing ~** öskürək tutması

**spell**$^2$ [spel] *v* I ovsunlamaq, sehrləmək, cadulamaq, tilsimə salmaq; məftun/valeh etmək

**spell** [spel] *v* II *(pt, pp* **spelt** [spelt] *və ya* **spelled** [speld]) 1. sözü hərflərlə demək və ya yazmaq; *Spell your name Adını/Adınızı hərflərlə de/deyin; We don't pronounce some English words as we spell them Biz bəzi ingilis sözlərini yazdığımız kimi tələffüz etmirik*; 2. hərf-hərf/güclə oxumaq; 3. məna vermək, göstərmək, bildirmək, demək; *Such an error spells the ruin of our hopes Belə səhv bizim ümidlərimizin boşa çıxdığını deyir/göstərir*; **to ~ out** 1) güclə/hərf-hərf oxumaq, hecələmək; 2) hərf-hərf diktə etmək/demək; 3) şifrini açmaq; izah/şərh etmək; **to ~ out a text** mətni şərh/izah etmək

**spell-bound** ['spelbaund] *adj* 1. məftun/valeh olmuş, vurulmuş; 2. heyrətə salınmış, çaşdırılmış, sarsıdılmış

**spelling** ['spelɪŋ] *n* 1. sözləri hərflərlə/hərf-hərf yazma; 2. yazı/imla qaydaları, imla, orfoqrafiya; **variant ~ of a word** sözün yazılışının variantı; sözün başqa cür yazılışı/yazılması/imlası

**spelt** [spelt] **to spell** II *felinin pt, pp formaları*

**spend** [spend] *v (pt, pp* **spent** [spent]) 1. xərcləmək, sərf etmək, xərc etmək; **to ~ money** pul/para xərcləmək; **to ~ time** vaxt sərf etmək; **to ~ labour/strength** zəhmət/güc sərf etmək; **to ~ much money on foolish pleasures** axmaq əyləncələrə çox pul/para sərf etmək; *She's spent all her money O, bütün pullarını xərcləyib; She spends too much (money) on clothes O, paltara həddən artıq pul xərcləyir/pul sərf edir*; 2. keçirmək *(vaxt)*; **to ~ one's time in reading/in playing tennis** vaxtını oxumaqla/tennis oynamaqla keçirmək

**spender** ['spendə$^r$] *n* bədxərc, israfçı; **a big ~** çox bədxərc/israfçı

**spending-money** ['spendɪŋ.mʌnɪ] *n* cibxərcliyi, cari xərclər üçün pul/para

**spendthrift** ['spendθrɪft] *n* bədxərc, israfçı, pulu sağa-sola səpən *(adam)*

**spent**$^1$ [spent] *adj* 1. boş, istifadə olunmuş/ edilmiş; **a ~ cartridge** boş patron; **a ~ bullet** boş güllə; **~ steam** istifadə edilmiş buxar; 2. sakitləşmiş; sönmüş; **~ storm** sakitləşmiş tufan; **~ volcano** sönmüş vulkan; 3. əldən/haldan/ düşmüş, tabsız, gücsüz

**spent**$^2$ [spent] **to spend** *felinin pt, pp formaları*

**sperm** [spə:m] *n* sperma, məni *(kişi tənasül hüceyrəsi)*, toxum

**spew**$^1$ [spju:] *n* qusuntu

**spew**$^2$ [spju:] *v* 1. qusmaq, qaytarmaq; *She spewed up the entire meal O bütün yeməyi qusdu/qaytardı*; 2. fışqırmaq; *Water spewed out of the hole Su deşikdən bayıra fışqırdı*

**spewy** ['spju:ɪ] *adj* nəm, yaş; bataqlıq

**sphere** [sfɪə$^r$] *n* 1. kürə, şar; 2. qlobus *(Yer kürəsinin modeli)*; 3. yer kürəsi; 4. planet, göy cismi; 5. səma, göy; 6. sahə, dairə *(fəaliyyət haq.)*; **the mental ~** əqli fəaliyyət sahəsi; **~ of influence/of interest** təsir/ maraq dairəsi; **in high ~s** yuxarı dairələrdə; *He moves in quite another spheres O tamamilə başqa dairələrdə dolaşır*

**spherical** ['sferɪkl] *adj* şarşəkilli, şarformalı, kürəşəkilli; **a ~ object** şarşəkilli/kürəşəkilli əşya/ obyekt

**spheroid** ['sfɪərɔɪd] *adj* sferoid *(yastı kürə şəklində həndəsi cisim)*

**spheroidal** [sfɪə'rɔɪdl] *adj* sferoidşəkilli, yastı, kürəşəkilli

**spherometer** [sfɪə'rɔmɪtə$^r$] *n* sferometr *(optik şüşələrin çaplik radiusunu ölçmək üçün cihaz)*

**sphinx** [sfɪŋks] *n (pl* **sphinges**) 1. sfinks *(qədim Misirdə daşdan yonulmuş adam başlı şir heykəli)*; 2. müəmmalı qəribə adam; *He was always a sphinx to me O həmişə mənim üçün müəmmalı adam olub*

**spice**$^1$ [spaɪs] *n* 1. ədviyyat, aşqar; xuruş; 2. kəskinlik, tündlük

**spice**$^2$ [spaɪs] *v* 1. ədviyyat vurmaq/qatmaq; 2. kəskinləşmək, tündləşmək

**spice-box** ['spaɪsbɔks] *n* ədviyyat qabı/qutusu

**spiced** [spaɪst] *adj* ədvəli, ədvə vurulmuş/qatılmış

**spicy** ['spaɪsɪ] *adj* 1. ədvəli, ədvə qatılmış; 2. ətirli, tünd; 3. *d.d.* gözəl/qəşəng geyinmiş, bəzənib-düzənmiş, geyinib-kecinmiş; gözəl, qəşəng, yaraşıqlı *(paltar haq.)*; 4. *d.d.* kəskin, maraqlı, ağıllı; **~ conversation** maraqlı/ağıllı söhbət

**spider** ['spaɪdə$^r$] *n* 1. *zool.* hörümçək; 2. qaniçən, qansoran, zalım, qəddar *(adam)*; 3. uzunsaplı tava

**spider-like** ['spaɪdəlaɪk] *adj* hörümçəkvarı, hörümçəyəoxşar, hörümçək kimi

**spidery** ['spaɪdərɪ] *adj* 1. hörümçək, hörümçəyəoxşar, hörümçəyəbənzər; 2. nazik, zərif; **a ~ handwriting** nazik əlyazısı/xətt; 3. hörümçək toruna bənzər/oxşar; 4. hörümçəkli; hörümçək bol olan

**spied** [spaɪd] **to spy** *felinin pt, pp formaları*

**spike**$^1$ [spaɪk] *n* I *bot.* sünbül

**spike** [spaɪk] *n* II 1. iti çıxıntı; uc; diş *(mişarda, daraqda və s.)*; 2. dəlmə, deşmə *(çeki və s.)*; **to put on the ~** deşmək/dəlmək *(çeki və s.)*; 3. *pl* çıxıntılar *(ayaqqabının altında)*



**spike**$^2$ [spaɪk] *v* 1. dəlmək, deşmək, soxmaq; 2. dişlə/ucla təmin etmək; 3. mıx/başıəyri mismar vurub bərkitmək; 4. mıx/mıxça vurmaq; 5. rədd/loğv etmək; **to ~ a proposal** təklifi rədd etmək

**spiked** [spaɪkt] *adj* 1. milli, diş-diş; **a ~ helmet** milli dəbilqə; **~ shoes** altı diş-diş ayaqqabı; 2. şişuclu; **a ~ lattice** şişuclu məhəccər/barmaqlıq

**spiker** ['spaɪkə$^r$] *n* hücumçu *(voleybol oyununda)*

**spiky** ['spaɪkɪ] *adj* I 1. sünbüllü, çox/iri sünbüllü; 2. sünbülvarı, sünbülşəkilli, sünbüləoxşar

**spiky** ['spaɪkɪ] *adj* II 1. tikanlı; 2. sivri, sivriuclu, şiştəpəli, itiuclu; şişlənmiş, itilənmiş; **~ plants** şiştəpəli bitkilər; **~ leaves** itiuclu/sivriuclu yarpaqlar; 3. deyingən, deyinən; tezacıqlanan, tezhirslənən, tündməcaz, əsəbi *(adam haq.)*

**spill**$^1$ [spɪl] *n* I 1. qəlpə, qırıntı, qırıq, parça; yonqar, talaşa; 2. paya, payacıq; 3. tıxac, qapaq, ağac probka

**spill** [spɪl] *n* II 1. tökmə; axma, axıtma; tökülmə; 2. *d.d.* yıxılma *(atdan, velosipeddən və s.)*; **to have a ~** yıxılmaq; 3. *d.d.* axın, sel, leysan

**spill**$^2$ [spɪl] *v (pt, pp* **spilt** [spɪlt] *və ya* **spilled**) 1. tökülmək, axmaq; tökmək, axıtmaq; **to ~ water/milk/coffee, etc.** su/süd/kofe və s. tökmək; **to ~ blood** qan axıtmaq/axmaq; *Much innocent blood is spilt in war Müharibədə çoxlu günahsız qan axır/axıdılır; Who has spilt/spilled the coffee on the carpet? Xalçanın üstünə kim kofe töküb? The tears spilled down her cheeks Yaş onun yanaqlarından (aşağı) axdı*; 2. axışmaq *(adam haq.)*; *The crowd spilt over from the church into the streets Camaat kilsədən küçələrə axışdı*; 3. ağzından qaçırmaq *(sözü, sirri)*, sirri açmaq/danışmaq;

◊ **to cry over spilt milk** ≅ kəsilən başın zülfü üçün ağlamaq; **to ~ money** mərcdə pul uduzmaq; **to ~ the beans** ağzından qaçırmaq *(sözü, sirri)*; laqqırtı vurmaq

**spillage** ['spɪlɪdʒ] *n* tələfat, itirmə, itki; azalma; silkələnib dağılma/itmə *(daşınma zamanı)*; **to prevent oil ~s** yanacağın itkisinin qarşısını almaq

**spin**$^1$ [spɪn] *n* I fırlanma, hərlənmə, dövrə vurma; hərlətmə, fırlatma

**spin** [spɪn] *n* II 1. iti axan mayenin şırnağı; 2. iti sürmə/getmə; qısa gəzinti *(avtomobildə, velosipeddə və s.)*; **to go for a ~ in a car** avtomobillə qısa gəzintiyə çıxmaq

**spin**$^2$ [spɪn] *v* I (**-nn-**; *pt* **spun** [spʌn] *və ya arx.* **span** [spæn]; *pp* **spun** [spʌn]) 1. əyirmək, eşmək *(sapı)*; 2. hörmək; sarımaq *(hörümçək, ipəkqurdu və s. haq.)*; **to ~ a cocoon** barama sarımaq; 3. düzəltmək, uydurmaq; 4. fırlanmaq, hərlənmək; fırlatmaq; *My head spins Mənim başım fırlanır/hərlənir*; **to ~ stories** yalan-palan uydurmaq; **to ~ off** əyirmək, əyirib qurtarmaq; **to ~ out** 1) uzatmaq; **to ~ out a discussion/negotiations** müzakirəni/danışıqları uzatmaq; **to ~ out time** vaxtı uzatmaq; 2) uzanmaq; 3) qənaət etmək, qənaətlə işlətmək; **to ~ out energy** enerjini qənaətlə işlətmək, enerjiyə qənaət etmək; **to ~ out money** pula qənaət etmək

**spin** [spɪn] *v* II (**-nn-**; *pt* **spun** [spʌn] *və ya arx.* **span** [spæn]; *pp* **spun** [spʌn]) 1. sürətlə axmaq, tökülmək, fəvvarə vurmaq; 2. cəld hərəkət etmək/getmək *(avtomobildə, velosipeddə və s.)*; 3. tez qurtarmaq *(həm də* **to ~ away**); *His money spins away Onun pulu tez qurtarır; Time spins Vaxt tez keçir*

**spinach** ['spɪnɪdʒ] *n* 1. *bot.* ispanaq; 2. *d.d.* zir-zibil, pis şey *(yemək və s. haq.)*

**spinal** [spaɪnl] *adj* bel; onurğa; **~ bone** fəqərə, fəqərə sümüyü; **~ column** bel/onurğa sümüyü; **~ cord/marrow** onurğa beyini, haram ilik; **~ curvature** onurğa sümüyünün əyilməsi

**spindle** ['spɪndl] *n* 1. *toxuc.* iy; krujeva mili; makara *(tikiş və toxuma maşınlarında)*; **dead/live ~** hərəkətsiz/fırlanan iy; 2. uzun arıq adam; 3. *tex.* spindel *(hərlənən dəzgahların əsas valı)*

**spindle-legged** ['spɪndllegd] *adj* iyqıç, uzunqıç; **a ~ woman** iyqıç qadın

**spinner** ['spɪnə$^r$] *n* 1. əyirici, iplik əyirən fəhlə; 2. əyirici maşın; 3. hörümçək

**spinning** ['spɪnɪŋ] *n* 1. əyirmə; əyrilmə; 2. iplik

**spinning-house** ['spɪnɪŋhaus] *n* iplik karxanası/fabriki

**spinning-machine** ['spɪnɪŋmə.ʃi:n] *n* əyirici maşın

**spinning-mill** ['spɪnɪŋmɪl] *n* 1. əyirici fabrik; 2. baramaaçan karxana/fabrik

**spinning-wheel** ['spɪnɪŋwi:l] *n* cəhrə

**spinster** ['spɪnstə$^r$] *n* 1. qarımış qız; 2. əyirici qadın/qız, cəhrəçi

**spinstress** ['spɪnstrɪs] *n* 1. əyirici, yun əyirən qadın/qız; 2. = **spinster** *(1-ci mənada)*

**spiral**$^1$ ['spaɪrəl] *n* 1. spiral; 2. burum; 3. spiralvarı/ spiralşəkilli əşya

**spiral**$^2$ ['spaɪrəl] *adj* spiral, spiralşəkilli, buruq; vintşəkilli, vintəoxşar, dolama; **a ~ staircase** dolama pilləkən; **a ~ drill** spiralşəkilli burğu /matqab

**spiral**$^3$ ['spaɪrəl] *v* (**-ll-**) 1. spiral istiqamətində burmaq; 2. fırlanmaq, burulmaq; *The leaf spiralled to the ground Yarpaq fırlanıb torpağa düşdü; The smoke spiralled upwards Tüstü yuxarıya doğru buruldu*

**spirit** ['spɪrɪt] *n* I 1. can, ruh, qəlb, ürək, könül; **~ and matter** ruh və materiya; **in (the) ~** fikrən, ürəyində; **Holy Spirit** müqəddəs ruh; 2. mənəvi güc, qətiyyət; **a man of ~** ruhən qətiyyətli/güclü adam; **to break one's ~** ruhunu qırmaq/sarsıtmaq; **to infuse/to put ~ into** *smb.* bir kəsi ruhlandırmaq; *He met the accusation with spirit O, ittihamı qətiyyətlə/ ləyaqətlə qarşıladı;*

3. *pl* ovqat, əhval, əhvali-ruhiyyə; kef; **to be in high/in good/in low/in bad ~s** kefi yüksək/yaxşı/aşağı/pis olmaq; **to be out of ~s** kefsiz olmaq; **to revive** ***smb.'s*** **~s** bir kəsin kefini qaldırmaq, bir kəsi ruhlandırmaq; 4. mahiyyət, əsas məna; **the ~ of the speech** nitqin mahiyyəti/əsas mənası; 5. ümumi xarakter/sociyyə/istiqamət/meyl; **the ~ of class struggle** sinfi mübarizənin ümumi sociyyəsi/istiqaməti; 6. kabus, qarabasma, kölgə; **to believe in ~s** kabusa inanmaq;

◊ **to take** ***smth.*** **in the right/wrong ~** bir şeyi düz/yanlış qavramaq/başa düşmək; **to show a proper/a right ~** özünü yaxşı cəhətdən göstərmək

**spirit** [ˈspɪrɪt] *n* II *adət. pl* 1. spirt; **methylated ~(s)** denaturatlaşdırılmış *(içmək üçün yararsız hala salınmış)* spirt; **~(s) of wine** şərab spirti; 2. *pl.* spirtli içki; *I don't drink whisky or brandy or any other spirits Mən viski, brəndi və ya başqa hər hansı bir spirtli içki içmirəm*

**spirited** [ˈspɪrɪtɪd] *adj* canlı, alovlu; parlaq, qızğın, ciddi; cəsarətli; **~ conversation** canlı/qızğın/ciddi söhbət; **~ reply** parlaq/ciddi cavab; **~ attack** ciddi hücum; **~ critique** cəsarətli tənqid; **~ translation** parlaq tərcümə

**spiritless** [ˈspɪrɪtlɪs] *adj* təşəbbüssüz, ölüvay, ləng, həvəssiz; ağırtərpənən, qorxaq, cəsarətsiz, ürəksiz; maraqsız; sönük; **~ life** maraqsız/sönük həyat; **a ~ man** təşəbbüssüz/ölüvay /cəsarətsiz adam; **a ~ story** sönük/maraqsız hekayə

**spiritual**¹ [ˈspɪrɪtʃuəl] *n* 1. dindar, dindar adam; 2. dini zənci himni

**spiritual**² [ˈspɪrɪtʃuəl] *adj* 1. ruhi, mənəvi; dini; əqli, zehni; **~ songs** dini mahnılar; *The theatre is her spiritual home Teatr onun mənəvi evidir*; 2. müqəddəs, ilahi

**spit**¹ [spɪt] *n* I şiş; **to roast a chicken on a ~** şişdə cücə qızartmaq

**spit** [spɪt] *n* II 1. selik, tüpürcək, ağız suyu; bəlğəm, hayxırıq; 2. xırda yağış, tisək

**spit**² [spɪt] *v* I (-tt-) 1. şişə taxmaq; 2. deşmək, dələmək; sancmaq; deşik-deşik/dəlik-dəlik etmək

**spit** [spɪt] *v* II (-tt-; *pt, pp* **spat** [spæt]; *amer.* **spit** [spɪt]) 1. tüpürmək; **to ~ in** ***smb.'s*** **face** bir kəsin üzünə tüpürmək; *The baby spat its food onto the table Uşaq/Körpə yeməyini stolun üstünə tüpürdü*; 2. saymaz/etinasız münasibət göstərmək; **to ~ on/upon** ***smb./smth.*** bir kəsə/bir şeyə etinasızlıq göstərmək; 3. xırda-xırda yağmaq *(yağış haq.)*, tisəkləmək, çiskinləmək; damcılamaq; 4. səpələnmək, tökülmək *(qar haq.)*; 5. fınxırmaq *(heyvan haq.)*; 6. çırtıldamaq, qığılcım səpmək *(ocaq haq.)*;

◊ **to ~ fire** bərk qəzəblənmək

**spit-box** [ˈspɪtbɔks] *n* tüpürcəkqabı

**spite**¹ [spaɪt] *n* hirs, acıq, kin, qəzəb, ədavət; düşmənçilik, hirslilik; **out of/for/from/in ~** acıqla, acığına, acıqdan; *I'm sure she only said it out of spite Mən əminəm ki, o bunu acıqdan dedi*; **to bear** ***smb.*** **a ~, to have a ~ at/against** ***smb.*** bir kəsə qarşı ədavət/düşmənçilik bəsləmək; **in ~ of** baxmayaraq; *I went out in spite of the rain Yağışa baxmayaraq mən bayıra çıxdım*

**spite**² [spaɪt] *v* 1. acıqla/acıqdan etmək; 2. əsəbiləşdirmək, cırnatmaq, özündən çıxartmaq; 3. düşmənçilik münasibəti/ədavət bəsləmək

**spiteful** [ˈspaɪtfl] *adj* hirsli, acıqlı, qəzəbli, kinli; bədxah, paxıl, kinsaxlayan

**spitefully** [ˈspaɪtfəlɪ] *adv* hirslə, acıqla, qəzəblə; kinli-kinli, hirsli-hirsli, qəzəbli-qəzəbli, bədxahcasına

**spitefulness** [ˈspaɪtfəlnɪs] *n* acıqlılıq, qəzəblilik, bədxahlıq, kinlilik

**spitfire** [ˈspɪtfaɪəʳ] *n* bədqılıq, qılıqsız, rəftarsız *(adam)*, çılğın/tez əsəbiləşən adam

**spittoon** [spɪˈtu:n] *n* tüpürcəkqabı

**splash**¹ [splæʃ] *n* 1. şappıltı, şıppıltı, şırpıltı; **to hear a ~** şappıltı/şıppıltı eşitmək; **to fall into the water with a ~** şappıltı ilə suya yıxılmaq; 2. sıçrantı, səpinti; damcı; **a ~ of water** sü səpintisi/damcısı; 3. ləkə; **a ~ of ink on the carpet** xalçanın üstündə mürəkkəb ləkəsi;

◊ **to cut/to make ~** səs-küy qaldırmaq, sensasiya yaratmaq

**splash**² [splæʃ] *v* 1. sıçramaq, sıçratmaq; batırmaq; **to ~ water** suyu sıçratmaq; *The water splashed on the floor Su döşəməyə sıçradı*; **to ~ *smb./smth.* with mud** bir kəsi/bir şeyi palçıqla batırmaq; **to ~ a page with ink** səhifəyə mürəkkəb sıçratmaq, səhifəni mürəkkəblə batırmaq; 2. şappıldatmaq, şappıldamaq; **to ~ *one's* oars** avarını şappıldatmaq; 3. şappıltı ilə düşmək/yıxılmaq; **to ~ into the water** şappıltı ilə suya düşmək/yıxılmaq; 4. örtmək; *Fields were splashed with poppies Çöllər lalələrlə örtülmüşdü*; 5. *d.d.* israfçılıq etmək, sağa-sola xərcləmək, sovurmaq *(pulu)*; **to ~ money (about)** pulu sağa-sola xərcləmək/səpmək

**splashly** [ˈsplæʃlɪ] *adj* 1. yaş, nəm; **~ ground** nəm torpaq; 2. əyri-üyrü, düz olmayan; 3. sensasion, sensasiyalı, nəzəri cəlb edən

**splat** [splæt] *n* şappıltı; *The tomato hit the wall with a splat Pomidor şappıltı ilə divara dəydi*

**splatter** [ˈsplætəʳ] *v* 1. şappıldatmaq; sıçratmaq, tökmək *(suyu)*; 2. şappıldamaq; sıçramaq; 3. özünə burnunun altında danışmaq

**splay**¹ [spleɪ] *adj* 1. əyri, qıyqac, çəp; genişlənən; 2. aralı, aralanmış, burulmuş; **~ knees** aralı/aralanmış dizlər; 3. ləng, ağır; yöndəmsiz, əyri-ayaq, əyripəncə

**splay**² [spleɪ] *v* 1. çəpləşdirmək, əymək, 2. deşiyin/ dəliyin kənarlarını genişləndirmək; genəltmək, enlətmək, genişləndirmək; genəlmək, enlənmək

**splay-footed** [ˈspleɪˈfutɪd] *adj* 1. əyriayaq, əyripəncə, ayağı/pəncəsi əyri; 2. *məc.* bacarıqsız, yöndəmsiz, ağır, ləng, ağırtərpənən



**spleen** [spli:n] *n* 1. *anat.* dalaq; **an enlarged ~** böyümüş dalaq; 2. hirs, acıq, qəzəb, ədavət; tez acıqlanma/hirslənmə, tündməcazlıq; **to vent *one's* ~ on/upon *smb.*** bir kəsə hirslənmək/acıqlanmaq

**splendid** [ˈsplendɪd] *adj* 1. parlaq; **a ~ achievement /result/victory** parlaq nailiyyət/nəticə /qələbə; 2. möhtəşəm, təmtəraqlı, təntənəli, dəbdəbəli, cah-calallı; zəngin; **a ~ palace** möhtəşəm/təmtəraqlı/cah-calallı saray; **a ~ temple** möhtəşəm/dəbdəbəli məbədgah/məbəd/kilsə; **a ~ present** zəngin hədiyyə; **a ~ dinner** zəngin/dəbdəbəli nahar; 3. *d.d.* çox gözəl/yaxşı, əla; **a ~ chance for escape** qaçmaq üçün çox yaxşı/əla imkan; **a ~ idea** çox gözəl fikir/ideya; **to have a ~ time** vaxtı çox yaxşı/əla keçirmək; *That's splendid! Çox yaxşı/əla!*; 4. kübar; **to live in a ~ fashion** kübar həyatı yaşamaq/keçirmək

**splendidly** [ˈsplendɪdlɪ] *adv* parlaq, əla, çox yaxşı, çox qəşəng/gözəl, dəbdəbə ilə, təmtəraqla, cah-calalla

**splendor** [ˈsplendəʳ] *n amer.* = **splendour**

**splendour** [ˈsplendəʳ] *n* 1. parlaqlıq, parlama; **the ~ of the jewels** daş-qaşın parlaması; 2. təmtəraq, ehtişam, dəbdəbə, əzəmət, cah-calal, büsat; qəşənglik, gözəllik; **the ~s of Rome** Romanın ehtişamı/ əzəməti/cah-calalı; **to live in great ~** böyük dəbdəbə içərisində yaşamaq; 3. böyüklük; şərəf, şöhrət; alicənablıq, nəciblik, mərdlik; **the ~ of *smb.'s* deed** bir kəsin igidliyinin/qəhrəmanlığının böyüklüyü/ şöhrəti

**splinter**¹ [ˈsplɪntəʳ] *n* 1. qəlpə, qırıntı, qırıq, parça; **a ~ of bomb/of glass/of stone** bombanın/şüşənin/daşın qəlpəsi; 2. talaşa, qıxmıq; 3. planka, tamasa *(ensiz hamar lövhə)*

**splinter**² [ˈsplɪntəʳ] *v* 1. doğramaq, yarmaq, parçalamaq; sındırmaq; 2. parçalanmaq, sınmaq; *The mirrow cracked but didn't splinter Güzgü çatladı, lakin parçalanmadı/sınmadı*

**split**¹ [splɪt] *n* 1. sınma, parçalanma; hissələrə ayrılma/ayırma; 2. çatlaq, çat, ara; yarıq; **a ~ in a door** qapıda çat/yarıq; **a ~ in a rock** qayada çat/yarıq; 3. nifaq, təfriqə, ikitirəlik; **a ~ among friends** dostlar arasında nifaq; **a ~ in the party** partiyada təfriqə;

◊ **to make all ~** səs-küy qaldırmaq, aranı qarışdırmaq, həngamə qaldırmaq, vəlvələ salmaq

**split**² [splɪt] *adj* 1. sınmış, parçalanmış; **~ bone** sınmış sümük; 2. bölünmüş

**split**³ [splɪt] *v* (-tt-; *pt, pp* **split**) 1. yarmaq, parçalamaq; **to ~ a board** taxtanı yarmaq/parçalamaq; **to ~ *one's* skull** (öz) kəlləsini yarmaq; *The wind split a sail Külək yelkəni parçaladı; A mountain was split by the earthquake Zəlzələ dağı yardı/parçaladı*; 2. yarılmaq, parçalanmaq; qırılmaq; *This wood splits easily Bu odun asan yarılır*; 3. sındırmaq, qırmaq, dağıtmaq; 4. hissələrə bölmək, bölmək, ayırmaq *(adət.* **to ~ up)**; **to ~ (up) a cake** pirojnanı hissələrə bölmək; **to ~ profits** gəlirləri hissələrə bölmək/ayırmaq; **to ~ (up) the work among a number of people** işi müəyyən miqdar adam arasında bölmək; 5. bölünmək, ayrılmaq; *The crowd split (up) into several groups Kütlə bir neçə qrupa bölündü/ayrıldı; They split after six years of marriage Onlar evləndikdən altı il sonra ayrıldılar*; 6. küsmək, küsüşmək; **to ~ with *smb.*** bir kəsdən küsmək;

◊ **to ~ *smb.'s* ears** bir kəsin qulağını batırmaq; **to ~ a hair/hairs/straws** 1) boş/xırda şey üstündə mübahisə etmək; 2) höcətlik göstərmək/etmək; **to ~ *one's* ideas** gülməkdən qarnı cırılmaq

**splitter** [ˈsplɪtəʳ] *n* 1. təfriqəçi, təfriqə/ nifaq/ ayrılıq/ ikitirəlik salan *(adam)*; 2. bərk/dəhşətli baş ağrısı; 3. bıçaqçı *(camdək doğrayan adam)*

**splitting** [ˈsplɪtɪŋ] *adj* 1. kəskin, bərk *(ağrı haq.)*; 2. qulaqbatıran, qulaqbatırıcı *(gülüş haq.)*; 3. son dərəcə gülməli, çox gülməli/məzəli; 4. çox iti/sürətli, başgicəlləndirici, başgicəlləndirən *(sürət haq.)*

**splotch**¹ [splɔtʃ] *n* böyük ləkə; günəş ləkəsi; **a ~ of colour/of light** boya/işıq ləkəsi

**splotch**² [splɔtʃ] *v* 1. ləkə salmaq; 2. sıçratmaq, çiləmək, batırmaq

**splotchy** [ˈsplɔtʃɪ] *adj* 1. ləkəli, ləkə ilə örtülmüş; 2. ləkəyəoxşar, ləkəyəbənzər

**splutter**¹ [ˈsplʌtəʳ] *n* 1. çaxnaşma, qarışıqlıq, hərc-mərclik, hay-küy, vəlvələ, mərəkə, səs-küy; 2. qırıq-qırıq/əlaqəsiz nitq; 3. fışıltı, fışıldama, çırtıltı; şarıltı, şappıltı, şıppıltı

**splutter**² [ˈsplʌtəʳ] *v* 1. qırıq-qırıq/rabitəsiz danışmaq, təngnəfəs danışmaq *(həyəcandan və s.)*; boğula-boğula danışmaq *(həyəcandan, hirsdən və s.)*; 2. fışıldamaq, çatırdamaq, şıqqıldamaq; *A waning candle splutters Yanıb qurtarmaqda olan şam çatırdayır*; 3. çiləmək, sıçratmaq, səpələmək; 4. ləkə salmaq *(pero ilə)*

**spoil**¹ [spɔɪl] *n* 1. qənimət; **the ~s** hərbi qənimət; **to the victors belong the ~s** qənimət qaliblərə məxsusdur, qənimət qaliblərindir; 2. məğlub olmuş və ya öldürülmüş düşməndən götürülmüş silah və ya yaraq-əsləhə; 3. oğurlanmış mal/şey; **the ~(s) of thieves** oğruların qəniməti; 4. *arx.* soyğunçuluq, talançılıq; **to give a town up to ~** şəhəri qarət etməyə vermək; 5. *pl seçkidə qalib gəlmiş partiyanın tərəfdarları arasında bölünən hökumət vəzifələri*; 6. incəsənət əsəri, çətin əldə edilən nadir kitab və s.; 7. heyvan cəsədinin qalıqları; 8. korlama, korlanma, xarab etmə/olma; 9. zərər, ziyan; **to do much ~ on/upon *smb.*** bir kəsə çox ziyan vermək/vurmaq

**spoil**² [spɔɪl] *v* (*pt, pp* **spoilt** [spɔɪlt] *və ya* **spoiled** [spɔɪld]) 1. korlamaq, xarab etmək; **to ~ a dish** yeməyi korlamaq/xarab etmək; **to ~ a fountain-pen** avtomat qələmi korlamaq/xarab etmək; *The damp has spoilt my watch Nəm mə-*

*nim saatımı xarab edib; The bad news has spoilt my day Pis xəbər mənim günümü korlayıb; It'll spoil my appetite Bu mənim iştahamı korlayacaq;* 2. korlanmaq, xarab olmaq *(ərzaq haq.); Fishes/Vegetables spoil quickly Balıq/Tərəvəz tez xarab olur;*

◊ **to be ~ing for a fight** 1) vuruşa/davaya can atmaq; 2) dava-dalaşa qoşulmaq

**spoilt[1]** [spɔɪlt] *adj* ərköyün, ərköyün böyüdülmüş, şıltaq, nadinc; **a ~ child** ərköyün/şıltaq/nadinc uşaq

**spoilt[2]** [spɔɪlt] **to spoil** *felinin pt, pp formaları*

**spoke[1]** [spouk] *n* 1. dəndənə *(təkərdə)*; 2. pillə *(nərdivanda)*; 3. dəstə, qulp, tutacaq;

◊ **to put a ~ in *smb.'s* wheel** bir kəsin işinə mane olmaq/əngəl törətmək

**spoke[2]** [spouk] *v* 1. dəndənə salmaq *(təkərə)*; 2. mane olmaq, əngəl törətmək

**spoke[3]** [spouk] **to speak** *felinin pt forması*

**spoken[1]** ['spoukən] *adj* şifahi, danışıq; **a ~ language** 1) danışıq dili; 2) şifahi nitq

**spoken[2]** ['spoukən] **to speak** *felinin pp forması*

**spokesman** ['spouksmən] *n* *(pl* **-men** [mən]) nümayəndə, deleqat, natiq

**sponge[1]** [spʌndʒ] *n* 1. *zool.* süngər; 2. süngər, hamam lifi; **rubber ~** rezin süngər; **to have a ~ down** süngərlə sürtünmək; 2. *tib.* tampon, tıxac, piltə *(yaraya qoymaq üçün)*

**sponge[2]** [spʌndʒ] *v* 1. liflə yumaq/təmizləmək; **to ~ *one's* body** bədəni liflə sürtmək; **to ~ a coat** süngərlə təmizləmək; 2. süngər yığmaq/ toplamaq, tüfeyli həyat keçirmək; **to ~ on *one's* friends** dostlarının hesabına yaşamaq; 3. yazını süngərlə silmək; **to ~ down** silmək, yumaq *(süngərlə); He sponged down the car with clean water O, maşını təmiz su ilə süngərlə yudu*

**spongy** ['spʌndʒɪ] *adj* 1. məsaməli, deşik-deşik; yumşaq; boş *(torpaq haq.)*; **~ bone** məsaməli sümük; **~ ice** yumşaq/boş buz; 2. bataq, bataqlı; 3. yumşaq; **a ~ carpet** yumşaq xalça

**sponsor[1]** ['spɔnsə[r]] *n* 1. zamin, zəmanətçi, zamin olan *(adam)*; **to be ~ for *smb.*** bir kəsə zamin olmaq; **to stand ~ for *smb.*** bir kəsə zamin durmaq; 2. sponsor *(hər hansı bir müəssisəni, layihəni və s. maliyyələşdirən adam)*; 3. təşkilatçı, təşkil edən *(adam)*

**sponsor[2]** ['spɔnsə[r]] *v* 1. zamin olmaq; 2. hər hansı bir tədbiri, layihəni və s. maliyyələşdirmək; sponsorluq etmək; **to ~ an athlete/a bill** atletə/layihəyə sponsorluq etmək

**sponsorship** ['spɔnsəʃɪp] *n* 1. sponsorluq; 2. maliyyələşdirmə; 3. zəmanət, zaminlik, qarantiya

**spontaneity** [.spɔntə'neɪətɪ] *n* 1. öz-özünə törəmə, xarici təsirdən asılı olmama, kor-təbiilik; 2. vasitəsizlik

**spontaneous** [spɔn'teɪnjəs] *adj* 1. spontan; **a ~ offer of help** spontan kömək təklifi; 2. öz-özünə törəyən, qeyri-iradi; kortəbii; **~ combustion** öz-özünə alovlanma; **~ gangrene** öz-özünə əmələ gələn qanqren; **~ generation** kortəbii törəmə; 3. könüllü; *He made a spontaneous offer of his services O öz xidmətlərini könüllü olaraq təklif etdi;* 4. səmimi; biixtiyar, qeyri-şüuri, qeyri-ixtiyari; **~ admiration** səmimi heyranlıq; **~ movement** biixtiyar/qeyri-ixtiyari hərəkət; **~ suggestion** səmimi təklif

**spoof[1]** [spu:f] *n* 1. parodiya *(bir əsərin gülməli təqlidi)*; 2. *d.d.* yalan, masqara, uydurma, ələ salma, masqaraya qoyma

**spoof[2]** [spu:f] *v* aldatmaq, uydurmaq, ələ salmaq, masqaraya qoymaq

**spook[1]** [spu:k] *n* 1. xəyal, kölgə, kabus, ruh; *Are you afraid of spook? Sən/Siz ruhdan/kabusdan qorxursanmı?/ qorxursunuzmu?*; 2. *d.d.* dəlibaş/maşını dəli kimi sürən sürücü; 3. *d.d.* narkoman

**spook[2]** [spu:k] *v* 1. gəlmək; peyda olmaq, gözə görünmək, dolaşmaq *(ruh, kabus haq.)*; 2. qorxutmaq, hürkütmək; canına vəlvələ /vahimə salmaq; **to ~ at the sight of a gun** silahı görəndə qorxmaq; *Something in the bushes spooked her horse Kol-kosda olan nə isə onun atını hürkütdü*

**spooky** ['spu:kɪ] *adj* **(-ier, -iest)** qorxulu, vahiməli; **a ~ old castle** vahiməli köhnə qəsr

**spoon[1]** [spu:n] *n* I qaşıq; **a wooden ~** taxta qaşıq; **a silver ~** gümüş qaşıq; **to eat *smth.* with ~** bir şeyi qaşıqla yemək;

◊ **to be past the ~** uşaq yaşından çıxmaq, böyümək; **to be born with a silver ~ in *one's* mouth** ≅ xoşbəxt ulduz altında doğulmaq

**spoon** [spu:n] *n* II 1. *d.d.* sadədil, sadəlövh, sadə *(adam)*, maymaq, fərsiz *(adam)*; 2. sentimentalcasına vurğun adam; **to be ~s on *smb.*** bir kəsə sentimentalcasına vurulmaq

**spoon[2]** [spu:n] *v* I qaşıqla götürmək *(adət.* **to ~ out/up)**; **to ~ sugar from the packet into a bowl** şəkəri qaşıqla torbadan şəkər qabına tökmək

**spoon** [spu:n] *v* II 1. pərəstişkarlıq etmək; 2. əzab çəkmək *(bir kəs üçün)*

**spoonfeed** ['spu:nfi:d] *v* *(pt, pp* **-fed)** 1. qaşıqla yedirtmək *(uşağı, xəstəni və s.)*; 2. *məc.* çeynəyib ağzına qoymaq; **to ~ material to pupils** materialı çeynəyib şagirdlərin ağzına qoymaq, materialı şagirdlərə ətraflı şəkildə başa salmaq/izah etmək

**spoon-food** ['spu:nfu:d] *n* = **spoon-meat**

**spoonful** ['spu:nful] *n* *(pl* **-fuls)** qaşıqdolusu; **a ~** bir qaşıq

**spoon-meat** ['spu:nmi:t] *n* sulu xörək

**spoony[1]** ['spu:nɪ] *n d.d.* = **spoon II**

**spoony[2]** ['spu:nɪ] *adj* 1. axmaq, gic, sarsaq; 2. vurğun, vurulmuş, məftun, aşiq; 3. həssas, nazikürəkli, incəqəlbli, sentimental

**sport[1]** [spɔ:t] *n* 1. idman; **to go in for ~s** idmanla məşğul olmaq; *Hockey, volleyball, football and tennis are all sports Hokkey, voleybol, futbol və tennis hamısı idmandır; He is fond of sport O, idmanı çox sevir;* 2. ov, balıq ovu; **to have good ~** yaxşı ov etmək; 3. əyləncə, oyun, kef; **for ~'s sake** əyləncə xatirinə; 4. zarafat; **to say *smth.* in ~** bir şeyi zarafatla/zarafatyana demək;

◊ **~ of kings** 1) cıdır; 2) şahinlə ov

**sport[2]** [spɔ:t] *v d.d.* 1. nümayiş etdirmək; şıq geymək, şıq geyinib gəzmək; özünü göstərmək; **to ~ a diamond ring** brilyant üzüyü taxıb nümayiş etdirmək; 2. idmanla/ovla və s. məşğul olmaq

**sporting** ['spɔ:tɪŋ] *adj* 1. idman; **a ~ event** idman hadisəsi; 2. boş, mənasız *(həyat haq.)*

**sportscast** ['spɔ:tska:st] *n* idman verilişi

**sportscaster** ['spɔ:ts.ka:stə[r]] *n* idman şərhçisi/icmalçısı

**sports-ground** ['spɔ:tsgraund] *n* idman meydanı

**sportsman** ['spɔ:tsmən] *n* *(pl* **-men** [-mən]) 1. sportsmen, idmançı; **a first-grade ~** birinci dərəcəli sportsmen/idmançı; 2. ovçu; balıqçı, balıqtutan; 3. vicdanlı oyunçu

**sportsmanlike** ['spɔ:tsmənlaɪk] *adj* 1. idmançı/sportsmen kimi, idmançıya/sportsmenə oxşar; 2. cəsarətli, mərd; vicdanlı

**sportsmanship** ['spɔ:tsmənʃɪp] *n* 1. idmançı ustalığı/bacarığı; 2. təmizlik, düzgünlük; vicdanlılıq, alicənablıq; 3. fiziki hazırlıq/inkişaf

**sportswear** ['spɔ:tsweə[r]] *n* idman paltarı/geyimi

**sportswoman** ['spɔ:ts.wumən] *n* *(pl* **-women** [-.wɪmɪn]) idmançı qadın/qız

**sporty** ['spɔ:tɪ] *adj* 1. idmanı/sportu çox sevən; **~ youths** idmanı çox sevən gənclər; 2. idmançıya məxsus, idmançı; **a ~ back** idmançı kürəyi; 3. qəşəng, gözəl, cazibədar *(xüs. geyim haq.)*; **a ~ shirt** qəşəng/gözəl köynək; 4. iti gedən və qəşəng *(avtomobil haq.)*; **a ~ Mercedes** idman Mersedesi

**spot[1]** [spɔt] *n* 1. ləkə; **a ~ of mud/of blood/of fat/of ink** palçıq/qan/yağ/mürəkkəb ləkəsi; **sun ~s** *astr.* günəş ləkələri; 2. yer, rayon; **a nice picnic ~** piknik/gəzinti üçün qəşəng yer; **danger ~s of the world** dünyanın təhlükəli rayonları; 3. biabırçılıq; şərəfsizlik; **without a ~ on his reputation** ləkəsiz adla/şöhrətlə; 4. sızanaq; **a face covered with ~s** sızanaqlı/sızanaqla örtülmüş sifət;

◊ **to be on the ~, to be in a ~** 1) çətin vəziyyətdə olmaq; 2) ölümlə nəticələnə biləcək vəziyyətdə olmaq; **to put *smb.* on the ~** bir kəsi öldürmək/həlak etmək; *There are spots on the sun at. söz. Günəş də ləkəsiz deyil, ≅ Eyibsiz gözəl olmaz*

**spot[2]** [spɔt] *v* **(-tt-)** *(davamedici zaman formalarında işlənmir)* 1. ləkələmək, ləkə salmaq; çirkləndirmək, bulamaq; **to ~ a table with ink** stolu mürəkkəblə ləkələmək; 2. rüsvay/biabır etmək, ləkələmək; 3. *d.d.* görmək, tanımaq; **to ~ a friend in a crowd** izdihamın içində dostu görmək/tanımaq; **to ~ a criminal** cinayətkarı tanımaq; 4. yerləşdirmək; *The officer spotted his men Zabit öz adamlarını yerləşdirdi;* 5. gələcək yarışlarda qalibi düzgün müəyyənləşdirmək; **to ~ the winner of a race** cıdırın qalibini əvvəlcədən müəyyənləşdirmək; 6. ləkəni aparmaq *(kimyəvi üsulla və s.)*

**spotless** ['spɔtlɪs] *adj* 1. təmiz; **a ~ room** təmiz otaq; 2. ləkəsiz, qüsursuz; **~ reputation** ləkəsiz/qüsursuz şöhrət; 3. xalsız, xalı olmayan *(heyvan haq.)*

**spotlight[1]** ['spɔtlaɪt] *n* 1. projektor; 2. fənər *(avtomobildə, parovozda)*

**spotlight[2]** ['spɔtlaɪt] *v* 1. projektorda işıqlandırmaq; 2. diqqət mərkəzinə qoymaq, diqqəti çəkmək *(bir şeyə)*

**spotted** ['spɔtɪd] *adj* 1. xallı; **a ~ leopard/deer** xallı bəbir/maral; 2. ləkəli, ləkələnmiş

**spouse** [spauz] *n* ər və ya arvad; *Fill in your spouse's name here Arvadınızın/Ərinizin adını bura yazın*

**spout[1]** [spaut] *n* 1. lülək *(çaydanda və s.)*; 2. boğaz *(şüşədə və s.)*; 3. nov, navalça; 4. şırnaq, axın *(maye haq.)*

**spout[2]** [spaut] *v* 1. fışqırmaq, fəvvarə vurmaq; sel kimi axmaq; *Blood spouted from the wound Yaradan qan fışqırdı;* 2. püskürmək; *A volcano spouts Vulkan püskürür;* 3. boşboğazlıq/ naqqallıq etmək

**sprain[1]** [spreɪn] *n tib.* əzələlərin gərilməsi

**sprain[2]** [spreɪn] *v tib.* əzələləri gərmək/dartmaq; **to ~ *one's* ankle** topuğunu burxutmaq

**sprang** [spræŋ] **to spring** *felinin pt forması*

**sprat** [spræt] *n* kilkə *(siyənək fəsiləsindən çox xırda yeməli balıq)*

**sprawl[1]** [sprɔ:l] *n* 1. etinasız/saymaz poza/duruş; *He sat in sprawl O sərələnib oturdu;* 2. yöndəmsiz/ağır/ləng hərəkət

**sprawl[2]** [sprɔ:l] *v* 1. sərələnmək, tirlənmək, sərələnib oturmaq; *He was sprawling in an armchair O, kresloda sərələnib oturırdu;* 2. hər tərəfə səpələnmək/dağılmaq, uzanmaq, yayılmaq

**spray[1]** [spreɪ] *n* I 1. cavan budaq, budaqcıq, şaxəcik, zoğ; 2. budaqşəkilli naxış

**spray** [spreɪ] *n* II 1. səpinti, sıçrantı, damcı *(xırda)*; **~ from waterfall** şəlalə sıçrantısı/ damcısı; 2. püskürdücü, tozlandırıcı *(mayeni: alət)*, pulverizator *(mayeni toz halında fışqırtmaq üçün cihaz)*

**spray[2]** [spreɪ] *v* 1. çiləmək, səpmək, sıçratmaq; pulverizasiya etmək *(mayeni)*; **to ~ water/perfume** su/ətir çiləmək; 2. gülləyə tutmaq, güllə yağdırmaq

**sprayer** ['spreɪə[r]] *n* püskürdücü, tozlandırıcı *(cihaz)*, pulverizator *(cihaz)*; forsunka *(cihaz)*

**spread[1]** [spred] *n* 1. yayılma; **the ~ of disease/of knowledge/of science** xəstəliyin/biliyin /elmin yayılması; 2. genişlik, ölçüsü/uzunluğu/eni olan; 3. atma, dağıtma, səpələnmə

**spread[2]** [spred] *v* *(pt, pp* **spread** [spred]) 1. yaxmaq; **to ~ butter on bread** çörəyin üstünə yağ yaxmaq/çəkmək; **to ~ glue on paper** kağıza yapışqan yaxmaq; 2. yaxılmaq; *This paint spreads well Bu boya yaxşı yaxılır;* 3. salmaq; **to ~ a cloth on a table** stolun üstünə süfrə salmaq; to

**~ a carpet on the floor** döşəməyə xalça salmaq; 4. sərmək; **to ~ a map on a table** stolun üstünə xəritə sərmək; 5. açmaq; *The bird spread its wings Quş qanadlarını açdı; A peacock spreads its tail Tovuzquşu quyruğunu açır;* **to ~ a banner/a newspaper** bayraq/qəzet açmaq; 6. uzatmaq; **to ~ *one's* hands to the fire** əllərini ocağa uzatmaq; 7. yaymaq; **to ~ rumours** şayiələr yaymaq; *Flies spread disease Milçəklər xəstəlik yayır;* **to ~ knowledge** bilik yaymaq; 8. möhlətlə vermək; vaxtını/möhlətini uzatmaq; **to ~ work/a course of study** işi/təhsil kursunu uzatmaq;

◊ **to ~ oneself** 1) çox işdən yapışmaq; hər şeyə əl atmaq; 2) xoşa gəlməyə çalışmaq; 3) natiqlik etmək

**spree** [spri:] *n* eyş-işrət, içki məclisi; əyyaşlıq; xudmani məclis; **to go on the ~** kef çəkmək/etmək, vaxtını kefdə/əyyaşlıqda keçirmək

**sprig**[1] [sprɪg] *n* 1. kiçik/balaca budaq, budaqcıq, şaxəcik; zoğ, cavan budaq; 2. budaqşəkilli naxış; 3. cavan adam/oğlan

**sprig**[2] [sprɪg] *v* **(-gg-)** 1. zoğlamaq, zoğ vermək/atmaq; 2. zoğu/cavan budağı kəsmək; 3. zoğşəkilli naxışla bəzəmək; 4. mıx/mismar vurmaq

**spriggy** [ˈsprɪgɪ] *adj* budaqlı, şaxəli, zoğlu

**sprightliness** [ˈspraɪtlɪnɪs] *n* gümrahlıq, diribaşlıq, qıvraqlıq, zirəklik; çalışqanlıq

**sprightly** [ˈspraɪtlɪ] *adj* canlı, şən; gümrah, diribaş, qıvraq, zirək; çalışqan; **~ style** canlı üslub; **a ~ young girl** şən/gümrah gənc qız; **a ~ dance** şən rəqs; **a ~ old man** gümrah/diribaş/qıvraq/zirək qoca kişi

**spring**[1] [sprɪŋ] *n* I 1. atılma, hoppanma, tullanma, sıçrama, sıçrayış; **to take/to make a ~** atılmaq, hoppanmaq, tullanmaq, sıçramaq; *The cat made a spring at the mouse Pişik siçanın üstünə atıldı/ tullandı/ sıçradı;* 2. güc, qüvvə, zirəklik, diribaşlıq, qıvraqlıq

**spring** [sprɪŋ] *n* II 1. bulaq, qaynaq, çeşmə; **hot/mineral ~** isti/mineral bulaq; 2. mənbə, başlanğıc, əmələ gəlmə; 3. sızma, axma, keçmə *(dəlikdən, deşikdən)*, 4. çat, yarıq, çatlamış/yarıq yer

**spring** [sprɪŋ] *n* III 1. yaz, bahar; *Spring is the most lovely season of the year Yaz/Bahar ilin ən gözəl/sevimli fəslidir;* 2. *şair.* başlanğıc, erkən dövr; doğma, törəmə, əmələ gəlmə; **the ~ of life** həyatın başlanğıcı; **the ~ of the day** şəfəq, dan yeri

**spring** [sprɪŋ] *n* IV 1. yay; **the ~s of a sofa/of a bed** divanın/çarpayının yayı; 2. elastiklik; 3. *pl* motiv, səbəb; **the ~s of an action/a decision** hərəkətin/qərarın səbəbi

**spring**[2] [sprɪŋ] *adj* I yaz, bahar; **~ flowers** yaz/bahar çiçəkləri; **~ weather** yaz/bahar havası; **~ sowing** yaz səpini; **a ~ day** yaz/bahar günü

**spring** [sprɪŋ] *adj* II bulaq, çeşmə; **~ water** bulaq/çeşmə suyu

**spring**[3] [sprɪŋ] *v (pt* **sprang** [spræŋ]; *pp* **sprung** [sprʌŋ]) I 1. tullanmaq, hoppanmaq, atılmaq, sıçramaq; **to ~ over *smth.*** bir şeyin üstündən sıçramaq/hoppanmaq; **to ~ on/upon *smb.*** bir kəsin üstünə atılmaq/tullanmaq; bir kəsə hücum etmək; **to ~ into the air** havaya atılmaq/tullanmaq; **to ~ (up) from *one's* seat** yerindən atılmaq/sıçramaq; 2. **(up)** qaldırmaq *(ov quşunu)*; **to ~ (up) a bevy of quails** bir sürü/dəstə bildirçin qaldırmaq; 3. qalxmaq; *A breeze sprang up Meh qalxdı;* 4. əmələ gəlmək, peyda olmaq; *The buds are springing on the branches Budaqlarda tumurcuqlar əmələ gəlir/peyda olur;* **to ~ back** geri tullanmaq/sıçramaq; **to ~ forward** irəli sıçramaq/atılmaq; **to ~ up** əmələ gəlmək, yaranmaq; *Dangers and difficulties spring up on every side Hər tərəfdən təhlükələr və çətinliklər əmələ gəlir/ yaranır;*

◊ **to ~ up like a mushroom** göbələk kimi artmaq/əmələ gəlmək

**spring** [sprɪŋ] *v (pt* **sprang** [spræŋ]; *pp* **sprung** [sprʌŋ]) II 1. axmaq, tökülmək, fışqırmaq; *Blood sprang from his wound Onun yarasından qan axdı/fışqırdı;* 2. vurmaq; *Blood sprang to my cheeks Qan mənim yanaqlarıma vurdu;* 3. dolmaq; *Tears sprang to her eyes Onun gözləri yaşla doldu;* 4. çıxmaq; *He is sprung from an old stock O, qədim nəsildən əmələ gəlib/çıxıb;* 5. yaratmaq; *He has sprung a new theory O, yeni nəzəriyyə yaradıb;* 6. çatlamaq, çat vermək, parçalanmaq; *The plank has sprung Taxta çatlayıb/çat verib;* 7. əzmək, zədələmək *(damarı, əzələni)*; 8. qazmaq; **to ~ a hole** quyu qazmaq

**spring** [sprɪŋ] *v (pt* **sprang** [spræŋ]; *pp* **sprung** [sprʌŋ]) III 1. yayla təmin etmək, yay salmaq; **to ~ a trap** tələ qurmaq; 2. örtülmək, çırpılmaq *(yayın köməkliyi ilə); The door sprang Qapı çırpıldı/örtüldü;* **to ~ to** çırpılıb örtülmək *(qapı haq.)*

**spring-balance** [ˈsprɪŋˈbæləns] *n* yaylı tərəzi, yaylı əl tərəzisi

**spring-bed** [ˈsprɪŋˈbed] *n* yaylı çarpayı

**springtime** [ˈsprɪŋtaɪm] *n* yaz/ bahar vaxtı

**springy** [ˈsprɪŋɪ] *adj* bulaqlı, çeşməli, bulaq/çeşmə çox/bol olan

**sprinkle**[1] [ˈsprɪŋkl] *n* 1. səpmə, çiləmə; sıçratma, fışqırtma; 2. xırda, narın; **~ of rain** xırda/narın yağış, çiskin; **~ of snow** xırda qar, təzəcə yağmış qar; 3. pulverizatorla rəngləmə; 4. damcı, çox az/cüzi miqdar; 5. susəpələyən *(cihaz)*

**sprinkle**[2] [ˈsprɪŋkl] *v* 1. səpmək, çiləmək, sıçratmaq; *She sprinkled her coat with some perfume O, paltosuna bir az ətir səpdi/çilədi;* 2. tökmək; **to ~ the floor with sand** döşəməyə qum tökmək; 3. çilənmək, səpilmək, sıçramaq; *The water sprinkles up Su yuxarı sıçrayır;* 4. damcılamaq, çiskinləmək, tisələmək; *The rain continued to sprinkle Yağış tisələməkdə davam etdi*



**sprinkler** [ˈsprɪŋklə] *n* 1. çiləyici *(cihaz)*, pulverizator; 2. *k.t.* yağışyağdırıcı qurğu

**sprint**[1] [sprɪnt] *n* 1. sıçrayış, sıçrama; **~ at finish** finişqabağı sıçrayış; 2. *id.* sprint *(yaxın məsafəyə qaçma)*

**sprint**[2] [sprɪnt] *v* 1. götürülmək, birdən atılmaq/sıçramaq; şığımaq; *He had to sprint to catch the bus Avtobusa çatmaq üçün o götürülməli oldu; He sprinted just before the finishing line Finiş xəttinə yaxın o götürüldü;* 2. *id.* sprint yarışında iştirak etmək

**sprinter** [ˈsprɪntə] *n id.* sprinter *(qısa məsafəyə qaçan idmançı)*

**sprite** [spraɪt] *n* 1. pəri; 2. cin, damdabaca

**sprout**[1] [spraut] *n* cücərti, zoğ, cavan budaq

**sprout**[2] [spraut] *v* 1. cücərmək, zoğ vermək/buraxmaq; *We can't use these potatoes; they've all started to sprout Biz bu kartofları işlədə bilmərik; onların hamısı cücərməyə başlayıb;* 2. yetişdirmək, becərmək; **to ~ seeds** toxum yetişdirmək/becərmək; 3. qoymaq, uzatmaq; **to ~ a moustache** saqqal qoymaq/uzatmaq

**sprouce**[1] [spru:s] *n* 1. *bot.* küknar; 2. iynəyarpaqlı ağac; iynəyarpaqlı ağacın oduncağı

**sprouce**[2] [spru:s] *adj* 1. şıq, şıq geyinən, modabaz, gözəl/qəşəng geyinmiş, bəzənib-düzənmiş, geyinib-kecinmiş; 2. təmiz, tərtəmiz, səliqəli

**spruce** [spru:s] *v (həm də* **to ~ up)** *d.d.* 1. qaydaya salmaq; bəzəmək; geyindirmək, geyindirib-kecindirmək; 2. bəzənmək, özünə bəzək vermək, geyinib-kecinmək

**sprung** [sprʌŋ] **to spring** *felinin pp forması*

**spry** [spraɪ] *adj* cəld, çevik, zirək *(xüs. qocalar haq.)*

**spud**[1] [spʌd] *n* 1. kartof; **to peel ~s** kartof soymaq; 2. toxa, kərki

**spud**[2] [spʌd] *v* 1. toxalamaq, yeri boşaltmaq/yumşaltmaq; dibini doldurmaq/boşaltmaq; 2. qabığını soymaq/almaq, qabıqdan çıxarmaq

**spume**[1] [spju:m] *n* köpük; ərp

**spume**[2] [spju:m] *v* köpükləmək *(xüs. dalğa haq.)*

**spunk** [spʌŋk] *n* 1. cəsarət, mərdlik, igidlik, qoçaqlıq, cəsurluq, mətanət; **to have ~ to do *smth.*** bir şeyi etməyə cəsarətli/mətanətli olmaq; 2. çılğınlıq, tündməcazlıq, hirslilik, qeyz

**spunky** [ˈspʌŋkɪ] *adj* 1. cəsarətli, igid, qoçaq, mətanətli; 2. qızğın, çılğın, əsəbi

**spur**[1] [spə:] *n* 1. mahmız; şpor; **to put/to set ~s to *one's* horse** atını mahmızlamaq; 2. stimul *(hərəkətəgətirici səbəb/amil)*, səbəb; **the ~ of poverty** kasıblığın/yoxsulluğun səbəbi; 3. iti ucluq;

◊ **on the ~ of the moment** dərhal, bir anda, göz qırpınca; **to put/to set ~s to *smb.*** bir kəsi tələsdirmək

**spur**[2] [spə:] *v* **(-rr-)** 1. mahmızlamaq; 2. oyatmaq, qızışdırmaq, təhrik etmək; həvəsləndirmək; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir şey etməyə təhrik etmək/ həvəsləndirmək; 3. mahmız geyinmək; 4. bərk tələsmək; **to ~ forward/on** qovmaq, çaparaq sürmək *(atı)*, sürətlə/çaparaq getmək; qaçmaq

**spurious** [ˈspjuərɪəs] *adj* 1. saxta, qəlp; süni, qondarma; **a ~ coin/document** saxta sikkə/sənəd; **a ~ argument** saxta/qondarma/süni dəlil /sübut; 2. kəbinsiz, qeyri-qanuni

**spurless** [ˈspə:lɪs] *adj* mahmızsız

**spurn**[1] [spə:n] *n* 1. dümsük; təpik; 2. etinasızlıq/saygısızlıq/laqeydlik göstərmə, məhəl qoymama, xor baxma

**spurn**[2] [spə:n] *v* 1. təpikləmək, təpik/təpiklə vurmaq; 2. saymamaq, saya salmamaq, xor baxmaq, məhəl qoymamaq, laqeydlik /etinasızlıq göstərmək; rədd etmək; **to ~ *smb.'s* advice** bir kəsin məsləhətinə məhəl qoymamaq/laqeydlik göstərmək; **to ~ *smb.'s* invitation** bir kəsin dəvətinə laqeydlik göstərmək/məhəl qoymamaq; **to ~ *smb.'s* offer** bir kəsin təklifini saya salmamaq/rədd etmək; 3. təkəbbürlə/lovğa-lovğa davranmaq

**spurt**[1] [spə:t] *n* I 1. sıçrayış, sıçrama, tullanma, hoppanma; **to make a ~** birdən atılmaq/sıçramaq/götürülmək; 2. *id.* spurt *(hərəkətin, yerişin birdən gücləndirilməsi)*; **final ~** finişdə irəli atılma; 3. sıçrayış, gözlənilməz yüksəlmə *(qiymət və s. haq.)*; 4. tutma, hiddətlənmə, qızışma; **a ~ of anger** qəzəb tutması;

◊ **to put a ~ on** tələsdirmək, tələsmək

**spurt** [spə:t] *n* II şırnaq, axın; **a ~ of fire** alovun dili

**spurt**[2] [spə:t] *v* I 1. gözlənilməz/qəfil sıçrayış etmək; **to ~ at the last minute** son dəqiqədə gözlənilməz sıçrayış etmək; **to ~ to catch a train** qatara çatmaq üçün bərk/sürətlə qaçmaq/çaparaq getmək; 2. gözlənilmədən qalxmaq/yüksəlmək *(qiymət və s. haq.)*

**spurt** [spə:t] *v* II fışqırmaq, fəvvarə vurmaq, şırıltı ilə tökülmək, sel kimi axmaq; *Blood spurted out from the wound Yaradan qan fışqırdı/sel kimi axdı*

**sputnik** [ˈsputnɪk] *n* peyk, sputnik *(süni)*

**sputter**[1] [ˈspʌtə] *n* 1. səs-küy, qalmaqal, mərəkə, qarışıqlıq, çaxnaşma, qaçaqaç, hay-küy; 2. cəld rabitəsiz nitq, öz-özünə danışma, donquldanma; 3. *amer.* tüpürcək/ağız suyunun sıçraması

**sputter**[2] [ˈspʌtə] *v* 1. tüpürmək; tez-tez tüpürmək; 2. cəld və rabitəsiz danışmaq; öz-özünə /burnunun altında danışmaq, donquldanmaq; *He sputtered out his history O, başına gələnləri cəld və rabitəsiz danışdı;* 3. çatırdamaq, cızıldamaq *(odun, yağ və s. haq.)*;

◊ **to ~ out** sönmək *(mühərrik və s. haq.)*

**spy**[1] [spaɪ] *n* 1. casus, gizli xəfiyyə; 2. *hərb.* kəşfiyyatçı

**spy**[2] [spaɪ] *v (pt, pp* **spied)** 1. casusluq etmək; 2. izləmək; güdmək; **to ~ upon *smb.*** bir kəsi izləmək/güdmək; 3. baxmaq, gözdən keçirmək; müzakirə etmək, tədqiq etmək *(həm də* **to ~**

out); to ~ (out) the country/the land/the ground ölkəni/yeri/torpağı tədqiq etmək; 4. *astr.* teleskopla müşahidə etmək

**squabble[1]** ['skwɔbl] *n* söyüşmə, deyişmə, söyüş, çığır-bağır, qovğa; boş yerə mübahisə

**squabble[2]** ['skwɔbl] *v* deyişmək, sözləşmək, çəkişmək; mübahisə etmək, boş yerə küsüşmək

**squabby** ['skwɔbı] *adj* balaca və kök/şişman, pota

**squad** [skwɔd] *n 1. hərb.* qrup, dəst, bölmə; 2. xidmətə yeni gəlmiş əsgərlərin vzvodu; 3. *d.d.* təzə işçi/şagird; təcrübəsiz adamlar; 4. briqada; 5. *amer.* idman taqımı/komandası; **football ~** futbol taqımı/ komandası; **rowing ~** avarçəkənlərin komandası; 6. eskadra *(hərbi dəniz gəmilərinin və ya hava donanmasının böyük birləşməsi)*

**squadron** ['skwɔdrən] *n* 1. *hərb.* eskadron *(piyada qoşunda rotaya bərabər süvari qoşun hissəsi)*; 2. *av.* eskadrilya *(hərbi aviasiya bölməsi)*; 3. *dən.* eskadra *(hərbi dəniz donanması gəmilərinin böyük birləşməsi)*; 4. dəstə

**squalid** ['skwɔlıd] *adj* 1. kasıb, miskin; **a ~ dwelling** kasıb/miskin ev/mənzil; 2. pinti; səliqəsiz, natəmiz, çirkli; **a man of ~ appearance** səliqəsiz geyinmiş adam; 3. iyrənc, çox pis, mənfur, murdar; **~ winter** çox pis qış; 4. alçaq, yaramaz; **a ~ rascal** alçaq/əclaf/namərd adam; **a ~ scheme** mənfur/çox pis niyyət

**squalidity** [skwɔ'lıdıtı] *n* baxımsızlıq, miskinlik, boşluq; xarabazarlıq, viranəlik

**squall[1]** ['skwɔ:l] *n* I fəryad, nalə, fəğan, şivən, inilti, qulaqbatırıcı qışqırtı; zingilti, cığ-vığ, ciyilti

**squall** ['skwɔ:l] *n* II 1. qasırğa, boran, birdən qopan şiddətli qarlı/yağışlı külək; 2. *d.d.* səs-küy, qalmaqal, dava-dalaş, söyüşmə, dalaşma

**squall[2]** ['skwɔ:l] *v* bərkdən qışqırmaq/ bağırmaq/ çığırmaq; fəryad/fəğan qoparmaq; *The baby squalled Uşaq fəryad qopardı/bərkdən qışqırdı*

**squalling** ['skwɔ:lıŋ] *adj* qışqırıqçı, çığırğan, ağlağan; **a ~ baby** ağlağan uşaq

**squalor** ['skwɔ:ləʳ] *n* 1. palçıq, zığ, lil; çirk, çirkab, zibil; baxımsızlıq, bərbadlıq, xarabazarlıq, viranəlik; **to live in ~ and misery** viranəlikdə və çirkab içində yaşamaq; 2. yoxsulluq, kasıblıq, səfalət; 3. mənasızlıq, əhəmiyyətsizlik, boşluq; **the ~ of these ideas** bu fikirlərin mənasızlığı/boşluğu

**squander[1]** ['skwɔndəʳ] *n* israfçılıq, bədxərclik

**squander[2]** ['skwɔndəʳ] *v* israf/bədxərclik etmək; dağıtmaq *(pulu)*, sovurub puç etmək *(pulu, varı)*; **to ~ *one's* fortune/*one's* savings** var-dövlətini/əmanətini dağıtmaq/puç etmək; **to ~ *one's* money** pulunu dağıtmaq/israf etmək; **to ~ *one's* energy/*one's* strength** enerjisini/gücünü boş yerə sərf etmək; **to ~ *one's* health/talent** sağlamlığını/istedadını boş yerə məhv etmək; **to ~ *one's* time** vaxtını boş yerə itirmək

**square[1]** [skweəʳ] *n* 1. kvadrat; **exact/rough ~** dəqiq/ təxmini kvadrat; 2. kvadrataoxşar, kvadratabənzər, kvadratvarı; **a ~ of cloth** kvadrataoxşar/kvadratvarı parça tikəsi; **a ~ of glass** kvadratvarı şüşə; 3. sahə, meydan; **an open ~** açıq sahə; **Trafalgar Square** Trafalqar Meydanı; **Freedom Square** Azadlıq Meydanı; 4. məhəllə; *I live in the next square Mən o biri məhəllədə yaşayıram*; 5. xana, dama *(şahmat taxtasında və s.)*;

◊ **to break ~** bərqərar olunmuş qaydanı pozmaq; **to break no ~s** mənası/əhəmiyyəti olmamaq; **to break no ~s with *smb.*** bir kəslə mübahisə etməmək/ deyişməmək/höcətləşməmək/ çənələşməmək

**square[2]** [skweəʳ] *adj* 1. kvadrat formalı/şəkilli; çargül; **a ~ room** kvadratşəkilli/çargül otaq; **a ~ table** kvadrat formalı/çargül stol; 2. kvadrat *(ölçü vahidi)*; **a /one ~ metre** bir kvadrat metr; **a carpet six metres ~** altı kvadrat metr xalça; 3. namuslu, vicdanlı, təmiz; **a ~ deal** təmiz iş; *I want you to be square with me Mən istəyirəm ki, sən/siz mənimlə düz dolanasan/ dolanasınız*; 4. yaxşı qaydaya salınmış/qoyulmuş; **to get *smth.* ~** bir şeyi tam qaydaya salmaq/qoymaq; *We should get everything square before we leave Biz gedənə qədər hər şeyi qaydaya salmalıyıq/ qoymalıyıq*; 5. bərabər; **to be ~ with *smb.*** bir kəslə bərabər olmaq

**square[3]** [skweəʳ] *v* 1. kvadrat şəklə/formaya salmaq; 2. düzbucaq altında yonmaq/ düzəltmək; **to ~ off some wooden planks to make bookshelves** kitab rəfləri qayırmaq üçün taxtaları düzbucaq altında yonmaq; 3. düzəltmək; **to ~ *one's* shoulders** çiyinlərini düzəltmək; 4. *riyaz.* kvadrata yüksəltmək; **to ~ a number** rəqəmi kvadrata yüksəltmək; 5. qaydaya salmaq, yoluna qoymaq, həll etmək; **to ~ the matter with *smb.*** bir kəslə məsələni həll etmək; 6. hesablaşmaq, hesabı çürütmək; **to ~ accounts with *smb.*** bir kəslə hesablaşmaq/haqq-hesab çəkib üzülüşmək; bir kəsdən əvəzini çıxmaq/qisas/intiqam almaq; 7. *d.d.* ödəmək, vermək, haqqını/muzdunu vermək; **to ~ the porter** hambalın haqqını vermək; 8. **(with, to)** cavab vermək, uyğun gəlmək; *His practice doesn't always square with his principles Onun əməlləri prinsipinə həmişə uyğun gəlmir*; 9. uzlaşdırmaq; **to ~ *one's* theories with facts** nəzəriyyələrini faktlarla uzlaşdırmaq; **10. (by)** ölçmək; **to ~ other people by *one's* own rule** başqalarının əməllərini öz arşını ilə ölçmək; 11. *id.* hesabı bərabərləşdirmək *(oyunda)*; **to ~ away** 1) qaydaya salmaq/qoymaq; yoluna qoymaq *(işi və s.)*; 2) hazırlamaq; **to ~ up** 1) **(to)** döyüşə hazırlaşmaq *(boksda)*; 2) **(to)** cəsarətlə qarşılamaq, sinə gərmək; **to ~ up to difficulties** çətinliklərə sinə gərmək

**square[4]** [skweəʳ] *adv* 1. düz; **to sit/to stand ~** düz oturmaq/durmaq; **to hit *smb.* ~ on the jaw** bir



kəsi düz çənəsindən vurmaq; 2. *d.d.* namusla, vicdanla, doğru; **to play fair and ~** namusla oynamaq; 3. *d.d.* şərtsiz, tamamilə, tamam-kamal, büsbütün; **to stand ~ for a party** partiyanı tamamilə/büsbütün/şərtsiz müdafiə etmək

**squash[1]** [skwɔʃ] *n (pl* **squashes** *və ya* **squash)** 1. lət, əzinti; horra, sıyıq; **to go to ~** horraya dönmək; 2. meyvə şirəsi *(su qatılmış)*; **orange ~** portağal şirəsi; 3. basabas, tünlük; köhnə şeylər satılan yer; 4. yumşaq rezin top;

◊ **to go to ~** müflisləşmək, müflis olmaq

**squash[2]** [skwɔʃ] *v* 1. basıb əzmək, yastılamaq; **to ~ a fly** milçəyi basıb əzmək; 2. sıxmaq; **to ~ a lemon/an orange** limonu/portağalı sıxmaq; 3. əzilmək, horraya dönmək; *The fruit will squash if it is badly packed Əgər yaxşı qablaşdırılmasa, meyvə əziləcək/horraya dönəcək*; 4. *d.d.* yatırmaq, məhv etmək; **to ~ a rebellion** qiyamı yatırmaq; 5. itələyib salmaq/soxmaq; **to ~ *smb.* into a corner** bir kəsi itələyib küncə soxmaq; 6. keçmək, keçib getmək, itələyib/yarıb keçmək; 7. yığışmaq, toplaşmaq

**squashy** ['skwɔʃı] *adj* 1. yumşaq, ətli; **~ pears** yumşaq/ətli armud; **~ peaches** yumşaq/ətli şaftalılar; 2. bataq, bataqlı; **~ ground** bataq/bataqlı yer; **~ path** bataqlı cığır

**squat[1]** [skwɔt] *adj* 1. balaca və kök, pota; 2. güclü/qüvvətli/ağır zərbə, güclü təkan; 3. sarsıntı, sarsıma

**squat[2]** [skwɔt] *v* 1. çömələrək/sallağı oturmaq *(insan haq.)*; 2. *d.d.* oturmaq, əyləşmək; 3. qanunsuz olaraq evə köçüb yerləşmək

**squaw** [skwɔ:] *n* hindu qadın/qız

**squawk[1]** [skwɔ:k] *n* 1. kəskin/güclü/qulaq batıran qışqırtı/qışqırıq; qəhqəhə, qəhqəhə ilə gülmə; qaqqıldama *(toyuq)*; **to give/to let out a ~** bərkdən qışqırmaq, qəhqəhə ilə gülmək; 2. səsli-küylü şikayət/şikayət etmə

**squawk[2]** [skwɔ:k] *v* 1. bərkdən qışqırmaq, bağırmaq; 2. qəhqəhə ilə gülmək; 3. bərkdən qaqqıldamaq *(toyuq haq.)*; 4. *jarq.* səs-küylə şikayət etmək

**squeak[1]** [skwi:k] *n* 1. ciyilti, civilti; **the ~ of a mouse** siçanın ciyiltisi; **the ~ of a sparrow** sərçənin civiltisi; 2. cırıltı; **the ~ of a door** qapının cırıltısı; *The door opened with a squeak Qapı cırıltı ilə açıldı*; **the ~ of wheels** təkərlərin cırıltısı

**squeak[2]** [skwi:k] *v* 1. ciyildəmək, cikkildəmək, cibbildəmək; 2. cırıldamaq, xırçıldamaq, xışıldamaq; *These new shoes squeak Bu təzə ayaqqabılar cırıldayır*

**squeaky** ['skwi:kı] *adj* cırıldayan, cırıltılı; **a ~ chair** cırıldayan stul; **a ~ voice** cırıltılı səs

**squeal[1]** [skwi:l] *n* bərk/qulaq batıran qışqırtı/inilti

**squeal[2]** [skwi:l] *v* 1. bərk qışqırmaq/inildəmək; **to ~ in sudden pain** qəfil ağrıdan bərk qışqırmaq/inildəmək; 2. cırıltı/ciyilti eşitmək; *He heard the brakes squeal O, əyləclərin ciyiltisini eşitdi*; 3. *d.d.* şikayətlənmək, şikayət/narazılıq etmək, gileylənmək; etiraz/protest etmək; 4. xəbər/məlumat vermək; şeytanlamaq; *How did they find him? Someone must have squealed (on him) Onu necə tapdılar? Yəqin kimsə (onu) şeytanlayıb*;

◊ **to make *smb.* ~** bir kəsə hədə-qorxu gəlmək/ şantaj etmək

**squeamish** ['skwi:mıʃ] *adj* 1. şıltaq, vasvası, iradcıl; tələbkar, hər şeyi bəyənməyən, hər şeydən iyrənən; 2. ürəkbulanmasına meylli; *I feel squeamish Mənim ürəyim bulanır*; 3. zəif *(mədə haq.)*; mədəsi zəif olan; 4. küsəyən, tez küsən/inciyən, dəymədüşər; əsəbi, çox həssas

**squeeze[1]** [skwi:z] *n* 1. sıxma, sıxılma, basma; **to give *smb.'s* hand a ~** bir kəsin əlini sıxmaq; 2. qucaq, ağuş; *He gave me a friendly squeeze O məni dostcasına qucaqladı/ağuşuna aldı*; 3. *d.d.* darısqallıq, basırıq; *We all got in, but it was a tight squeeze Biz hamımız yerləşdik, amma çox darısqallıq idi*; 4. təzyiq; **to put a ~ on *smb.*** bir kəsə təzyiq göstərmək/etmək; 5. şantaj, zorakılıq, zorla/hədələməklə alma *(pul və s.)*

**squeeze[2]** [skwi:z] *v* 1. sıxmaq, əzmək; **to ~ *smb.'s* hand** bir kəsin əlini sıxmaq; **to ~ *one's* finger** barmağını əzmək *(qapının arasında qoyub və s.)*; 2. sıxıb suyunu çıxartmaq *(limonun, üzümün və s.) (həm də* **to ~ out)**; **to ~ wet clothes** yaş paltarı sıxıb suyunu çıxartmaq; **to ~ juice from a lemon** sıxıb limonun şirəsini/suyunu çıxartmaq; 3. məcbur etmək; **to ~ a confession from *smb.*** bir kəsi etirafa məcbur etmək; 4. zorla almaq/qoparmaq *(pul və s.)*; **to ~ money** zorla pul almaq/qoparmaq; 5. yükləmək, çətinə salmaq *(vergi qoymaqla və s.)*; 6. tıxamaq, dürtmək, soxmaq, təpmək; *He squeezed his hand through the opening O, əlini deşiyə soxdu/dürtdü*; **to ~ in** 1) soxmaq, dürtmək; 2) soxulmaq, dürtülmək;

◊ **to ~ off** çaxmağı buraxmaq, atəş açmaq

**squeezer** ['skwi:zəʳ] *n* şirəçıxardan, şirəsıxan *(cihaz)*

**squelch** [skweltʃ] *v* 1. tapdalamaq, ayaqlamaq, ayaq altında əzmək; məhv/yox/ləğv etmək; dağıtmaq, uçurtmaq, puç/bərbad/alt-üst etmək; 2. dayandırmaq, boğmaq, yatırtmaq, susdurmaq; saxlamaq; 3. *d.d.* şappıldatmaq, fırçıldatmaq *(palçığı, suyu)*

**squint[1]** [skwınt] *n* 1. çaşlıq, çəpgözlük; 2. oğrun baxış; ani nəzər; *Have a squint at this Buna nəzər sal/salın*; 3. meyl, təmayül, həvəs; **a ~ towards radicalism** radikalizmə meyl; 4. dəlik, deşik, göz *(qapıda və s.)*

**squint[2]** [skwınt] *adj* 1. çəp, çəpgöz; 2. çəpləndirilmiş, çəp edilmiş, əyilmiş

**squint[3]** [skwınt] *v* 1. çəp/əyri/çaş baxmaq; çəpgöz/çaşgöz olmaq; 2. oğrun/gizlin baxmaq; 3. gözlərini qıymaq; 4. meyl/həvəs göstərmək, meyli/həvəsi olmaq *(bir şeyə)*

**squint-eyed** ['skwıntaıd] *adj* 1. çəp, çaş, çəpgöz; 2. hirsli, acıqlı, qəzəbli, kinli

**squirm** [skwə:m] *v* 1. qovrulmaq, qıvrılmaq; əyilmək, bükülmək, qatlanmaq; 2. boyun qaçırmaq; **to ~ out of an obligation** öhdəliyi/təəhhüdü yerinə yetirməkdən boyun qaçırmaq; 3. qıvrılaraq hərəkət etmək; *The snake squirms among the leaves İlan qıvrılaraq yarpaqların arasından hərəkət edir*

**squirrel** ['skwırəl] *n zool.* 1. dələ; 2. dələ xəzi

**stab¹** [stæb] *n* 1. zərbə *(bıçaq, xəncər və s. ilə vurulan)*; **a ~ in the back** arxadan zərbə *(həm də məc)*; 2. gözlənilməz/qəfil ağrı; **a ~ of lumbago** işias /lümbaqo tutması; 3. *d.d.* təşəbbüs; **to make a ~ at conversation** söhbətə/danışığa təşəbbüs göstərmək

**stab²** [stæb] *v* (**-bb-**) 1. zərbə vurmaq *(bıçaqla, xəncərlə və s.)*; 2. soxmaq, sancmaq, batırmaq; **to ~ a knife into** *smb.***'s heart** bir kəsin ürəyinə bıçaq soxmaq/sancmaq; 3. yaralamaq *(iti silahla)*; 4. *d.d.* ziyan vurmaq, xətər yetirmək; 5. sancmaq, ağrıtmaq *(ağrı haq.)*

**stab-awl** ['stæbɔ:l] *n* biz

**stabile** ['steıbaıl] *adj* 1. sabit, stabil; 2. möhkəm, davamlı, sarsılmaz, yenilməz

**stability** [stə'bılıtı] *n* sabitlik, stabillik, möhkəmlik; sarsılmazlıq, dayanıqlıq

**stabilization, -sation** [ˌsteıbəlaı'zeıʃn] *n* sabilləşdirmə, stabilləşdirmə, sabitləşmə; möhkəmləşmə, möhkəmləşdirmə; **the ~ of currency exchange rates** valyuta məzənnəsinin sabitləşməsi/ sabilləşdirilməsi

**stabilize, -ise** ['steıbılaız] *v* sabitləşdirmək, stabilləşdirmək, möhkəmlətmək, möhkəmləşdirmək; **to ~ the dollar** dolların məzənnəsini sabitləşdirmək; **to ~ the front** *hərb.* cəbhədə vəziyyəti stabilləşdirmək

**stabilizer, -iser** ['steıbılaızəʳ] *n tex.* stabilizator

**stable¹** ['steıbl] *n* 1. tövlə, pəyə; burdaq, ağıl, yataq *(heyvan üçün)*; 2. manej *(at sürmək və qoşun təlimi və s. məqsədlər üçün xüsusi bina və ya yer)*

**stable²** ['steıbl] *adj* stabil, möhkəm, daimi; **~ equilibrium** möhkəm özül/bünövrə/təməl; **~ position** möhkəm/stabil vəziyyət; **~ peace** möhkəm/daimi sülh

**stable³** ['steıbl] *v* 1. tövləyə/pəyəyə/ağıla salmaq; 2. tövlədə/pəyədə/ağılda saxlamaq

**stableman** ['steıblmən] *n (pl* **-men** [-mən]) mehtər, atabaxan

**stabling** ['stæblıŋ] *adj* kəskin; **~ pain** kəskin ağrı

**stack¹** [stæk] *n* 1. taya *(ot, taxıl, küləş)*; 2. topa, yığın, qalaq; qucaq; **a ~ of wood 1)** bir topa/qalaq/qucaq odun; 3. tüstü borusu; 4. *d.d.* çox, çoxlu; **a ~ of work** çox/çoxlu iş; 5. *amer.* qəfəsə; stellaj *(bir şeyi dik halda saxlamaq üçün qurğu)*; 6. *hərb.* çatma *(tüfəngləri qoymaq üçün)*

**stack²** [stæk] *v* 1. topa yığmaq, topalamaq, qotmanlamaq, qotman vurmaq; qalaq vurmaq, qalaqlamaq; 2. *hərb.* tüfəngləri baş-başa çatmaq;

◊ **to ~** *one's* **opponent on his shoulders** düşmənin/ rəqibin kürəklərini yerə vurmaq

**stack-yard** ['stækja:d] *n* 1. xırman; 2. samanlıq

**stadium** ['steıdjəm] *n (pl* **-dia** [-dıə] *və ya* **stadiums**) stadion; **a football ~** futbol stadionu; **to build a new ~** yeni stadion tikmək

**staff¹** [sta:f] *n* I 1. əsa, əl ağacı; 2. əsa *(hökmranlıq əsası)*, hakimiyyət rəmzi; 3. dayaq, söykənəcək, dirək;

◊ **the ~ of life** gündəlik ruzi; **to have the ~ in** *one's* **own hand 1)** mal-mülkə sahib olmaq; 2) ağalıq etmək, hökm sürmək

**staff** [sta:f] *n* II 1. ştat; **to be on the ~** ştatda olmaq; 2. şəxsi heyət; əməkdaşlar; **teaching ~** professor-müəllim heyəti; **the ~ of a newspaper** qəzetin əməkdaşları; 3. *hərb.* qərargah, ştab; **the General Staff** Baş Qərargah; **regimental ~** polk/alay qərargahı

**staff²** [sta:f] *adj* 1. ştatlı, ştatda olan; **a ~ writer** qəzetin ştatda olan əməkdaşı; 2. ştab; **a ~ surgeon** ştab cərrahı; **a ~ officer** ştab zabiti

**staff³** [sta:f] *v* 1. ştabı komplektləşdirmək; əməkdaşlarla təmin etmək; 2. *hərb.* şəxsi heyəti komplektləşdirmək

**stag¹** [stæg] *n* 1. erkək maral *(beş ildən sonra)*; 2. öküz; 3. *d.d.* donosçu, xəbərçi, çuğulçu

**stag²** [stæg] *v* 1. *d.d.* təqib etmək, izləmək; güdmək; göz yetirmək; casusluq/xəbərçilik etmək; 2. donosçu/çuğulçu olmaq

**stag breeding** ['stægˌbri:dıŋ] *n* maralçılıq, maral yetişdirmə

**stage¹** [steıdʒ] *n* I 1. səhnə; teatr səhnəsi; estrada *(açıq səhnə)*; 2. *teatr.* teatr fəaliyyəti, dram sənəti; **to be/to go on the ~** aktyor olmaq; **to leave/to quit the ~ 1)** səhnədən/teatrdan getmək; 2) *məc.* ölmək; **to write for the ~** səhnə/teatr üçün yazmaq; 3. kino çəkilən pavilyon; 4. arena, meydan; **the ~ of politics** siyasət meydanı; 5. platforma *(hündür səki: dəmir yolunda və s.)*; 6. körpü *(gəmilərin yan alması üçün)*

**stage** [steıdʒ] *n* II 1. dövr, mərhələ, vaxt, pillə; **~ of development** inkişafın dövrü/mərhələsi/pilləsi; **the political ~** siyasi mərhələ; *The peace talks are now in their final stage Sülh danışıqları indi özünün son mərhələsindədir*; 2. stansiya, dayanacaq; **to get down at the next ~** növbəti stansiyada/dayanacaqda düşmək

**stage²** [steıdʒ] *adj* səhnə, teatr; **~ effect** səhnə təsiri/effekti

**stage³** [steıdʒ] *v* 1. tamaşa qoymaq; tamaşaya qoyulmaq *(pyes və s.)*; **to ~ a new production of "Hamlet"** "Hamleti yeni quruluşda səhnəyə qoymaq; 2. təşkil etmək; *They could stage huge protest demonstration Onlar nəhəng etiraz nümayişi təşkil edə bildilər*; 3. səhnələşdirmək, pyes şəklinə salmaq, səhnədə göstərmək üçün uyğunlaşdırmaq *(bədii əsəri)*

**staged** [steıdʒd] *adj* 1. səhnəyə qoyulmuş, səhnələşdirilmiş; **a ~ version of a novel** romanın səhnələşdirilmiş versiyası/variantı; 2. gizlicə/qəs-



dən/ yalandan/ süni surətdə düzəldilmiş, uydurulmuş; 3. vaxtaşırı baş verən, tədricən, mərhələ-mərhələ; **~ reduction of weapons** silahların tədricən/mərhələ-mərhələ azaldılması

**stage direction** ['steıdʒdı'rekʃn] *n* 1. səhnə remarkası *(pyesin mətninə müəllifin verdiyi izahat)*; 2. rejissorluq sənəti; 3. rejissorluq, tamaşanın rejissor planı

**stage-door** ['steıdʒdɔ:ʳ] *n* aktyorların səhnəyə çıxdığı qapı

**stage-manager** ['steıdʒˌmænıdʒəʳ] *n* rejissor

**stage-right** ['steıdʒraıt] *n* pyesi səhnəyə qoyma hüququ

**stage-whisper** ['steıdʒˌwıspəʳ] *n* səhnə/teatr pıçıltısı

**stagewinner** ['steıdʒˌwınəʳ] *n id.* mərhələnin qalibi

**stagger¹** ['stægəʳ] *n* səndələmə, tərpənmə, yırğalanma; **to give a ~** səndələmək; *She gave a stagger as she began to feel faint Bayğınlıq hiss etməyə başlayanda o səndələdi*

**stagger²** ['stægəʳ] *v* 1. səndələmək, səndələyə-səndələyə getmək; *I hit him hard and he staggered and fell Mən onu bərk vurdum, o səndələdi və yıxıldı*; 2. tərəddüd etmək, qərarsızlıq göstərmək; 3. şübhələndirmək, şübhə yaratmaq/oyatmaq; 4. son dərəcə heyrətləndirmək/heyrətə salmaq, sarsıtmaq, çaşdırmaq; 5. bölüşdürmək, bölmək, paylamaq

**staggering¹** ['stægərıŋ] *n* 1. səndələmə, qətiyyətsiz yeriş, inamsız hərəkət; 2. şahmat qaydası ilə düzmə; qeyri-bərabər yerləşmə

**staggering²** ['stægərıŋ] *adj* 1. səndələyən; tərəddüdlü, tərəddüd edən; 2. son dərəcə heyrətləndirici/ sarsıdıcı, heyranedici, valehedici; başgicəlləndirici; **a ~ achievement** başgicəlləndirici müvəffəqiyyət/ nailiyyət

**staggeringly** ['stægərıŋlı] *adv* 1. səndələyə-səndələyə; tərəddüdlü, qətiyyətsiz; 2. valeh/heyran ediləcək dərəcədə; **~ beautiful** heyran/valeh ediləcək dərəcədə gözəl

**staging** ['steıdʒıŋ] *n* 1. tamaşa, tamaşaya qoyma *(pyesi)*; **a new ~ of "Macbeth"** "Maqbetin" yeni tamaşası; 2. səhnələşdirmə *(romanı)*; 3. *tik.* taxtabənd *(fəhlələrin işləməsi üçün tikilən və ya təmir olunan binaların qabağında taxta-şalbandan və ya metaldan düzəldilən müvəqqəti qurğu)*

**stagnant** ['stægnənt] *adj* 1. durğun, axmaz *(su haq.)*; **~ water** durğun su; **~ pools** axmaz/axmayan gölməçələr; 2. ağır, boğuq, kəsif *(hava haq.)*; **~ air** ağır hava; 3. süst, ölüvay, ləng; **~ trade** ləng/süst ticarət

**stagnate** ['stægneıt] *v* 1. uzun zaman/müddət hərəkətsiz qalmaq, qalıb xarab olmaq *(su haq.)*; 2. fəaliyyətsiz/süst/hərəkətsiz olmaq

**stagnation** [stæg'neıʃn] *n* 1. durğunluq, ölgünlük; hərəkətsizlik; 2. çürümə; 3. kütlük, ətalət, tənbəllik

**staid** [steıd] *adj* ağır, sakit, təmkinli, vüqarlı, ciddi; yaşlı, ahıl; **a ~ old man** təmkinli ahıl kişi

**stain¹** [steın] *n* 1. ləkə; **ink ~** mürəkkəb ləkəsi; *There's an ink stain on his shirt Onun köynəyində mürəkkəb ləkəsi var*; 2. boyaq maddəsi

**stain²** [steın] *v* 1. ləkələmək, ləkə salmaq; çirkləndirmək; *Peach juice stains very badly Şaftalı şirəsi çox pis ləkə salır*; 2. ləkələnmək; *This carpet stains very easily Bu xalça çox tez ləkələnir*; 3. boyamaq, rəngləmək; *He stained the wood dark brown O, taxtanı tünd palıdı boyadı*; 4. rüsvay/biabır/bədnam etmək, ləkələmək; *The incident with the actress certainly stained his political career Aktrisa ilə olan əhvalat, əlbəttə, onun siyasi karyerasını ləkələdi*; 5. *toxuc.* naxış basmaq

**stained** [steınd] *adj* 1. ləkələnmiş; kirlənmiş, çirklənmiş, batmış, bulanmış; 2. rüsvay/biabır/bədnam olmuş; 3. boyanmış, rənglənmiş

**stained glass¹** ['steınd'gla:s] *n* rəngli/naxışlı şüşə

**stained glass²** ['steınd'gla:s] *adj* rəngli/naxışlı şüşədən düzəldilmiş; **~ windows** naxışlı şüşə salınmış pəncərələr

**stainless** ['steınlıs] *adj* 1. ləkəsiz, ləkəsi olmayan; 2. eyibsiz, nöqsansız, qüsursuz; təmiz; 3. paslanmayan; **~ steel** paslanmayan polad; **knives made of ~ steel** paslanmayan poladdan qayrılmış bıçaqlar

**stair** [steəʳ] *n* 1. pillə; 2. *pl* pilləkən; **at the head of the ~s** pilləkənin başında; *I came rushing down the stairs to greet her Mən onu qarşılamaq üçün pillkənləri üzü aşağı qaçdım*;

◊ **above ~s** yaşayış otaqlarında; **below ~s 1)** mətbəxdə, qulluqçuların otağında; 3) qulluqçuların arasında

**stair-carpet** ['steəka:pıt] *n* pilləkən xalçası, pilləkənə salınan xalça

**staircase** ['steəkeıs] *n* pilləkən; **spiral/winding ~** dolama pilləkən

**stair-step¹** ['steəstep] *n* pillə *(pilləkəndə)*

**stair-step²** ['steəstep] *adj* 1. pilləli, pillə-pillə qalxan; **~ levels of terrain** pilləli/pillə-pillə qalxan yamac; 2. əyri-üyrü; hamar/düz olmayan, kələ-kötür; 3. qeyri-sabit, qeyri-müntəzəm; **~ inflation** qeyri-sabit inflyasiya *(kağız pulun qiymətdən düşməsi)*

**stake¹** [steık] *n* I 1. paya, sütun, dirək; **to set/to drive ~s** *amer.* 1) sahəyə paya vurmaq; 2) həmişəlik yaşayış yerinə köçmək, kök/məkan salmaq, yerləşmək; 2. dayaq *(yeni basdırılmış ağaca vurulan)*; 3. nişan ağacı, paya *(yolda və s.)*

**stake** [steık] *n* II 1. ortaya/banka atılan pul *(qumar oyununda)*; 2. girov *(mərc gələrkən)*; 3. *pl* priz *(yarışda)*; 4. pay *(gəlirdən və s.)*; 5. bir işdə maraq; **to have a ~ in** *smth.* bir şeydə maraqlı olmaq;

◊ **to be at ~** qumara qoyulmaq; **to lay down/to set** *smth.* **at (the) ~** bir şeyi qumara qoymaq, bir şeylə risk etmək; **to play for high ~ 1)** böyük məbləğə oynamaq; 2) hər şeyə risk etmək; **to play for low ~s** az məbləğə oynamaq

**stake²** [steɪk] *v* I **1.** paya ilə nişanlamaq, bir şeyin sərhədini paya ilə göstərmək *(həm də* **to ~ off/out)**; **to ~ a claim** sahənin ətrafına paya vurmaq, paya ilə sahənin sərhədini nişanlamaq; **2.** ətrafını paya ilə kəsmək; **3.** söykəmək, dayaq vermək, möhkəmlətmək *(dayaq vermәklә)*; **4.** deşmək, dəlmək; **5.** vurub dəlmək/deşmək; iynələmək, sancmaq, batırmaq *(ucu şiş silahla)*, mıxlamaq; *The arrow staked him to the ground Ox onu yerə mıxladı*; **6.** övkələmək, övkələyib yumşaltmaq *(dərini)*; **to ~ in** çəpərləmək, hasarlamaq, ətrafına hasar çəkmək, hasara almaq;
◊ **to ~ off/out a claim for** ***smth.*** bir şeyə ixtiyarı olduğunu elan etmək/demək

**stake** [steɪk] *v* II **1.** ortaya/banka pul qoymaq *(qumar oyununda)*; **2.** mərc gəlmək; **3.** risk etmək; qumara qoymaq; **4.** beh vermək; avans vermək

**stale¹** [steɪl] *n* sidik *(heyvanlarda)*

**stale²** [steɪl] *adj* **1.** bayat, qurumuş; **~ bread** bayat çörək; **2.** ağır, üfunətli, pis, iylənmiş, qoxumuş; **~ air** ağır hava; **~ water** üfunətli/iylənmiş su; **~ meat** iylənmiş/qoxumuş ət; **3.** köhnəlmiş; bayağı, şit, duzsuz; **~ news** köhnəlmiş xəbər; **~ jokes** bayağı/şit/duzsuz zarafatlar; **~ plot** bayağı süjet; **4.** üzülmüş, həddən artıq yorulmuş, çox yorğun/üzgün; **5.** *hüq.* qanuni qüvvəsini itirmiş; **6.** *tic.* vaxtı uzadılmış, möhlət verilmiş, möhləti uzadılmış; **~ cheque/debt** vaxtı uzadılmış çek/ borc

**stale³** [steɪl] *v* I **1.** siymək *(heyvan)*

**stale** [steɪl] *v* II *şahm.* pat etmək; pat olmaq

**stalemate¹** [ˈsteɪlmeɪt] *n* **1.** *şahm.* pat *(şahmat oyununda oyunçunun öz şahını zərbə altına qoymadan hərəkət edə bilmədiyi vəziyyət)*; **2.** çıxılmaz/çətin vəziyyət; *Negotiations have reached (a) stalemate Danışıqlar çıxılmaz vəziyyətə düşüb*

**stalemate²** [ˈsteɪlmeɪt] *v* **1.** *şahm.* pat etmək; **2.** çətin/çıxılmaz vəziyyətə salmaq; *Negotiations have been stalemated Danışıqlar çıxılmaz vəziyyətə düşüb*

**stalk¹** [stɔ:k] *n* I **1.** saplaq; **to pick roses with long ~s** qızılgülləri uzun saplaqlı qoparmaq; **to remove the ~s from the cherries** gilasın saplaqlarını təmizləmək; **2.** özək; **cabbage ~** kələm özəyi; **3.** ayaq *(qədəhdə və s.)*; **4.** gövdə *(bitkidə)*

**stalk** [stɔ:k] *n* II **1.** ehtiyatlı/ehmallı izləmə *(ov quşlarını və s.)*; **2.** gizlicə/yavaş-yavaş yaxınlaşma, gizli irəliləmə *(ordu)*; **3.** təntənəli/əzəmətli/vüqarlı yeriş

**stalk²** [stɔ:k] *v* **1.** gizlincə/yavaş-yavaş yaxınlaşmaq, güdmək, izləmək, pusmaq; **to ~ a deer** maral izləmək; **2.** axtarıb tapmaq; **to ~ a criminal** cinayətkarı axtarıb tapmaq; **3.** gizli irəliləmək; **4.** yayılmaq *(epidemiya, şayə və s.)*

**stall¹** [stɔ:l] *n* **1.** *k.t.* bordaq; pəyə, tövlə; **2.** laryok, alver budkası, dükança, köşk; **3.** piştaxta; **4.** *teatr.* kreslo *(parterdə)*

**stall²** [stɔ:l] *v* I heyvanı bordağa bağlamaq; heyvanı bordaqda saxlamaq

**stall** [stɔ:l] *v* II **1.** dayandırmaq; dayanmaq; *The car stalled at the traffic-lights Maşın svetoforun yanında dayandı*; **2.** *av.* sönmək *(mühərrik haq.)*; **3.** söndürmək *(mühərriki)*; **4.** *d.d.* boyun qaçırmaq; **5.** *d.d.* mane olmaq, maneçilik törətmək, çətinləşdirmək; **6.** *amer. d.d.* uzatmaq, yubatmaq, əngəl çıxartmaq, ləngitmək; *Stop stalling and give me an answer! Uzatma/Uzatmayın, mənə bir cavab ver!/verin!*

**stall-holder** [ˈstɔ:l.houldəʳ] *n* alver budkası /dükançası/köşkü olan şəxs

**stallion** [ˈstæljən] *n* ayğır

**stalwart¹** [ˈstɔ:lwət] *n* **1.** yenilməz/səbatlı/mətin ardıcıl/tərəfdar, sarsılmaz/mətin müdafiəçi; **2.** sağlam/canıbərk adam; buzbaltası

**stalwart²** [ˈstɔ:lwət] *adj* **1.** möhkəm, sağlam, canıbərk; **~ will** möhkəm iradə; **2.** *məc.* mətanətli, mətin, cəsarətli, əzmli; səbatlı, qərarından dönməz; **~ declaration** cəsarətli/ əzmli bəyanat; **a ~ opponent** cəsarətli/səbatlı/qərarından dönməz rəqib; **a ~ knight** mətanətli/ cəsarətli/əzmli cəngavər

**stamina** [ˈstæmɪnə] *n* güc, qüvvə; möhkəmlik, dözümlülük; *Marathon runners must have plenty of stamina Marafon qaçıcılarının bərk dözümlülüyü/çoxlu gücü olmalıdır; He doesn't have the stamina to be a teacher Müəllim olmaq üçün onda dözümlülük yoxdur*

**stammer¹** [ˈstæməʳ] *n* kəkələmə, pəltəkləmə, pəltəklik

**stammer²** [ˈstæməʳ] *v* kəkələmək, pəltəkləmək, pəltək danışmaq

**stammerer** [ˈstæmərəʳ] *n* kəkə, pəltək *(adam)*

**stamp¹** [stæmp] *n* **1.** ştamp, ştempel; **rubber ~** rezin ştamp/ştempel; **wooden ~** taxta ştamp/ştempel; **a ~ on a document** sənəd üzərində ştamp/ştempel; **a date ~** tarix ştampı/ ştempeli; **2.** damğa, möhür; *Every article bears the stamp of the maker Hər bir məhsulun üstündə onun istehsalçısının möhürü olur*; **3.** yarlık *(malların üstünə yapışdırılan və onların adını, növünü, çəkisini və s. göstərən kağız)*; **4.** marka; **postage ~** poçt markası; **to collect ~s** marka yığmaq/toplamaq; *My son is collecting stamps Mənim oğlum marka toplayır/ yığır*; **5.** işarə, əlamət; **the ~ of genius/of suffering** dahilik/əzab-əziyyət əlaməti; **6.** növ, cür, qisim, qəbil; **a man of that ~** o növ/cür/qisim/qəbil adam

**stamp²** [stæmp] *v* **1.** ştamp/ştempel vurmaq; **to ~ a document/a letter** sənədə/məktuba ştamp vurmaq; **2.** möhür/damğa vurmaq; **3.** marka yapışdırmaq; **to ~ a letter** məktuba marka yapışdırmaq; **4.** həkk olunmaq, yadda qalmaq; *The scene is stamped on/in my memory Hadisə/Mənzərə mənim yaddaşıma həkk olunub*; **5.** səciyyələndirmək; *His actions stamp him as a wise man Onun hərəkətləri onu müdrik bir adam kimi səciyyələndirir*; **6.** döymək, vurmaq *(ayaqlarını)*; **to ~ the ground** ayaqlarını yerə döymək/vurmaq; **7.** tapdalamaq, ayaqlamaq; ayaqlayıb əzmək, ayaqla basıb əzmək; *Stamp on that cigarette O siqareti tapdala/tapdalayın*; **to ~ out 1)** odu söndürmək *(tapdalamaqla)*; **2)** yatırmaq, söndürmək *(üsyanı)*; **3)** kökünü kəsmək, yox etmək *(xəstəliyi və s.)*

**stamp-album** [stæmp.ælbəm] *n* marka albomu

**stamp-collecting** [ˈstæmpkəˈlektɪŋ] *n* marka toplama/yığma

**stamp-collector** [stæmpkəˈlektəʳ] *n* marka toplayan/yığan

**stampede¹** [stæmˈpi:d] *n* **1.** dəhşətli/vahiməli qaçaqaç, vəlvələ, çaxnaşma; **2.** qəfil kütləvi hərəkət

**stampede²** [stæmˈpi:d] *v* vahimə içərisində qaçmaq, dağınıq/pərakəndə halda qaçmaq; töküşmək; *The cattle stampeded towards the river Mal-qara çaya tərəf qaçdı/töküşdü*

**stance** [stæns] *n* duruş, vəziyyət, poza; **threatening ~** hədələyici/təhdidedici poza; **a tennis ~ for receiving the ball** topu qəbul etmək üçün tennis pozası

**stanch** [sta:ntʃ] *v* **1.** kəsmək, dayandırmaq *(qanaxmanı)*; **2.** kəsilmək, dayanmaq *(qanaxma haq.)*; **3.** yüngülləşdirmək, azaltmaq *(ağrını)*

**stand¹** [stænd] *n* **1.** dayaq, dirək; altlıq; üçayaq; **2.** asılqan; **a towel ~** məhrəba üçün asılqan; **3.** köşk, laryok, alver budkası, dükança *(qəzet, jurnal satmaq üçün)*; **4.** estrada *(açıq səhnə)*; **5.** tribuna *(stadionda)*; **6.** xitabət kürsüsü; **7.** yer, vəziyyət; **to take** ***one's*** **~** yerini tutmaq; **8.** dayanacaq *(avtobus üçün)*; **9.** fasilə; **to bring/to put to a ~** dayandırmaq, fasilə götürmək; **10.** çaşma, çaşıb qalma, çətinlik; **to put** ***smb.*** **at a ~** bir kəsi çətin vəziyyətə salmaq/çaşdırmaq; **11.** müdafiə etmə, qoruma; **to make a ~ for** ***smth./smb.*** bir şeyi/bir kəsi müdafiə etmək

**stand²** [stænd] *v (pt, pp* **stood** [stud]) I *əsas fel:* **1.** durmaq, dayanmaq; **to ~ on tiptoe** barmaqlarının üstündə/ucunda durmaq/dayanmaq; **to ~ at attention/at ease** farağat/azad dayanmaq; *The soldiers stood at/to attention Əsgərlər farağat durdular/dayandılar*; **to ~ in** ***smb.'s*** **light** bir kəsin işığını kəsmək/işığında durmaq; *Don't just stand there; help me Orada dayanma/dayanmayın, mənə kömək et/edin*; **2. (up)** ayağa qalxmaq/durmaq; **to ~ up** ayağa durmaq/qalxmaq; *He stood (up) politely when the lady entered the room Xanım otağa daxil olanda o nəzakətlə ayağa qalxdı/durdu*; **3.** yerləşmək; *The castle stands on a hill Qəsr təpənin üstündə yerləşir*; **4.** qoymaq, yerləşdirmək; **to ~ a ladder against a wall** nərdivanı divara dayamaq/ söykəmək; *She picked the child up and stood him on his feet O, uşağı yerdən qaldırdı və onu ayağı üstə qoydu*; **5.** möhkəm/bərk/davamlı olmaq; **6.** tab gətirmək, dözmək; **to ~ heat/pain** istiyə/ağrıya dözmək; **to ~ the test of time** zamanın sınağına tab gətirmək/dözmək; *He can't stand critism O, tənqidə dözmür*; **7.** qüvvədə qalmaq; *The order/The resolution will stand Əmr/Qətnamə qüvvədə qalacaq*; **8.** müəyyən nöqteyi-nəzəri müdafiə etmək; müəyyən mövqe tutmaq; *How does he stand on the disarmament question? Tərk-silah məsələsi haqqında onun mövqeyi necədir? He always stood for liberty O həmişə azadlığın tərəfdarı olub*; **9. (on, upon)** təkid/israr etmək, inadla məqsədə çatmaq; *He'll stand on his right O öz hüquqlarına təkid edəcək*; **10.** necə varsa; **to copy a passage as it ~s** parçanı/hissəni necə varsa elə də köçürmək; **to ~ for** ***smth.*** bir şeyi bildirmək; *White stands for purity Ağ rəng təmizlik əlamətidir/rəmzidir*; **to ~ by** ***smb.*** bir kəsi müdafiə etmək, bir kəsə sadiq olmaq; **to ~ by** ***one's*** **friends** dostlarına sadiq olmaq

**stand** [stænd] *v (pt, pp* **stood** [stud]) II *bağlayıcı fel:* **1.** olmaq; **to ~ alone 1)** tək olmaq; **2)** tayı /bərabəri olmamaq; **2.** kənarda durmaq, qarışmamaq; *Stand aside and let me pass! Kənarda dur/durun, qoy/qoyun keçim*; **to ~ aloof from an argument** mübahisəyə qarışmamaq; **to ~ in need of** ***smth.*** bir şeyə ehtiyacı olmaq; **to ~ ready for anything** hər şeyə hazır olmaq; **to ~ back** geri çəkilmək; *The policeman asked the crowd to stand back Polis (nəfəri) camaatdan geri durmağı xahiş etdi*;
◊ **to ~ on end** dimdik durmaq *(tük haq.)*; **to ~ well with** ***smb.*** **1)** bir kəsin gözündə yaxşı olmaq; **2)** bir kəslə yaxşı münasibətdə olmaq; **to ~ in** ***one's*** **own light** özünə ziyan etmək, öz işığını kəsmək, işıq gələn yerə papaq tıxamaq

**standard¹** [ˈstændəd] *n* **1.** bayraq; **to raise the ~ of revolt** üsyan/qiyam bayrağı qaldırmaq; **2.** standart, norma; **~s of international law** beynəlxalq hüquq normaları; **below/up to ~** standartdan aşağı/yuxarı; **3.** meyar; **~s of judgement** qiymət qoymanın meyarları; **4.** ölçü vahidi, beynəlxalq vahid; **~ of comparison** etalon *(ən dəqiq ölçü nümunəsi)*; **5.** dayaq, altlıq; **a ~ for a vase** vaz üçün altlıq;
◊ **to march under the ~ of** ***smb.*** bir kəsin davamçısı olmaq

**standard²** [ˈstændəd] *adj* **1.** standart, normaya uyğun/müvafiq; **a ~ size** standart ölçü; *This is the standard textbook on the subject Bu, fənnə uyğun dərslikdir*; **~ time** standart vaxt

**standard-bearer** [ˈstændəd.beərəʳ] *n* **1.** bayraqdar, bayraqçı; **2.** hərəkatın rəhbəri, lider, başçı

**standardization, -isation** [.stændədaɪˈzeɪʃn] *n* standartlaşdırma, normalaşdırma

**standardize, -ise** [ˈstændədaɪz] *v* standartlaşdırmaq; normalaşdırmaq, müəyyən normaya salmaq

**standfast** [ˈstændfa:st] *n amer.* **1.** etibarlı adam; **2.** möhkəm vəziyyət

**standing**[1] [ˈstændıŋ] *n* 1. mövqe; dərəcə, rütbə; ad, şöhrət; **a person of high ~** yüksək rütbəli şəxs; **a person of no ~** heç bir mövqeyi olmayan şəxs; **to be in good ~ with** ***smb.*** bir kəsin nəzərində yaxşı mövqedə olmaq; 2. köhnə; **a custom /an illness of long ~** köhnə adət/xəstəlik; **to be friends of old ~** köhnə dostlar olmaq; 3. staj;

◊ **to take** ***smth.*** **~** bir şeyi sakit qəbul etmək, həyəcanlanmamaq *(bir şeydən)*

**standing**[2] [ˈstændıŋ] *adj* 1. biçilməmiş, dik, ayaq üstə duran/dayanan; **~ corn/grain** biçilməmiş qarğıdalı/taxıl; 2. duran vəziyyətdə; **~ jump** *id.* yerindən tullanma/hoppanma; 3. daimi; arasıkəsilməz; **~ army** daimi ordu; **~ committee** daimi komitə; **~ invitation** daimi dəvət; 4. durğun, axmayan, axmaz; **~ water** durğun su

**stand order** [ˈstænd.ɔ:dəʳ] *n* nizamnamə, əsasnamə; reqlament

**standpoint** [ˈstændpɔınt] *n* nöqteyi-nəzər; baxım; *From a technical standpoint, this is a great advantage Texniki nöqteyi-nəzərdən/baxımdan bu çox böyük üstünlükdür*

**standstill** [ˈstændstıl] *n* 1. dayanma, fasilə; **to bring to a ~** dayandırmaq; **to come to a ~** dayanmaq; 2. hərəkətsizlik, durğunluq; **to be at a ~** hərəkətsiz/boş dayanmaq, işləməmək, fəaliyyət göstərməmək;

◊ **to ride a horse to a ~** atı sürüb/minib əldən salmaq

**stand-up** [ˈstændʌp] *adj* 1. dik, dik duran; **a ~ collar** dik duran yaxalıq; 2. ayaqüstü; **a ~ party** ayaqüstü qonaqlıq

**star**[1] [sta:ʳ] *n* 1. ulduz; **shooting ~** meteor; *The stars were shining in the sky Ulduzlar göydə/səmada parlayırdı; There are no stars out tonight Bu gecə heç bir ulduz yoxdur (yəni görünmür)*; 2. ulduz *(fiqur)*; 3. ulduzcuq; 4. ulduz *(fərqlənmə nişanı)*; 5. ulduz *(aparıcı aktyor və ya aktrisa)*; 6. qaşqa *(heyvanlarda)*; 7. bəxt, tale; ulduz; **to be born under a lucky ~** xoşbəxt ulduz altında doğulmaq; **to bless/to curse** ***one's*** **~s** taleyinə şükr etmək/lənət oxumaq;

◊ **~s and strips** ulduzlar və zolaqlar *(ABŞ-ın dövlət bayrağı)*

**star**[2] [sta:ʳ] *v* **(-rr-)** 1. ulduz düzmək, ulduzla bəzəmək; 2. ordenlə mükafatlandırmaq; 3. baş rol oynamaq *(kinoda, teatrda)*; *She took many starring roles O, çox baş rollarda oynayıb; The director wants Tom to star in his new film Rejissor istəyir ki, Tom onun yeni filmində baş rolda oynasın*

**star-blind** [ˈsta:blaınd] *adj* yarıkor, yarımkor

**starch**[1] [sta:tʃ] *n* kraxmal, nişasta

**starch**[2] [sta:tʃ] *v* kraxmallamaq, kraxmal vurmaq, nişasta vurmaq

**star-chart** [ˈsta:tʃa:t] *n* ulduz xəritəsi

**starched** [sta:tʃt] *adj* kraxmallanmış, kraxmal /nişasta vurulmuş

**star-dust** [ˈsta:dʌst] *n astr.* kosmik toz

**stare**[1] [steəʳ] *n* gözünü zilləmə; **to give** ***smb.*** **a ~** gözünü bir kəsə zilləmək

**stare**[2] [steəʳ] *v* 1. gözünü zilləmək, gözünü zilləyib baxmaq; **to ~ into** ***smb.'s*** **eyes** gözünü bir kəsin gözünə zilləmək; **to ~ into vacancy** gözünü boşluğa zilləmək;

◊ **to make people ~** hamını heyrətləndirmək

**star-fish** [ˈsta:fıʃ] *n zool.* dəniz ulduzu *(balıq)*

**stark**[1] [sta:k] *adj* **(-er, -est)** 1. sümükləşmiş, sümüyə dönmüş; keyimiş, keyləşmiş, qurumuş; 2. quru, faydasız, nəticəsiz, səmərəsiz, boş; 3. əhalisiz, adamsız; *The landscape was grey and stark Mənzərə boz və əhalisiz idi*; 4. *arx.* soyuq, şiddətli, güclü; **~ weather** soyuq iqlim; **~ wind** güclü/şiddətli külək; 5. tam, tamam, xalis; **~ nonsense/madness** tam cəfəngiyyat/dəlilik; **a ~ fool** xalis axmaq/sarsaq/gic

**stark**[2] [sta:k] *adv* tamamilə, bütövlükdə; **~ blind** tamamilə kor

**starkly** [ˈsta:klı] *adv* 1. qəti, qətiyyətlə, birdən, birdən-birə, keskin/sərt surətdə; 2. açıq, açıq-aydın, açıqdan-açığa; şübhəsiz; **~ different** açıq-aydın fərqli

**stark-naked** [ˈsta:kˈneıkıd] *adj* tamam lüt/çılpaq

**starless** [ˈsta:lıs] *adj* ulduzsuz; **~ sky/night** ulduzsuz səma/gecə

**starlet** [ˈsta:lıt] *n* 1. ulduzcuq, balaca ulduz; 2. parlamağa başlayan ulduz *(məşhurlaşmağa başlayan aktrisa, aktyor və s.)*

**starlight**[1] [ˈsta:laıt] *n* 1. ulduz işığı; **to walk home by ~** evə ulduz işığında getmək

**starlight**[2] [ˈsta:laıt] *adj* 1. ulduzlu; **a ~ night** ulduzlu gecə; 2. parlayan, parıldayan, işıldayan, işıqsaçan; **~ eyes** parlayan/işıqsaçan gözlər

**star-like** [ˈsta:laık] *adj* ulduzaoxşar, ulduzşəkilli, ulduzvarı, ulduz kimi

**starling** [ˈsta:lıŋ] *n zool.* sığırçın

**starlit** [ˈsta:lıt] *adj* ulduzlu; **a ~ night** ulduzlu gecə

**starry** [ˈsta:rı] *adj* **(-ier, -iest)** 1. ulduzlu; **a ~ night/sky** ulduzlu gecə/səma; 2. ulduz kimi parlayan; **~ eyes** ulduz kimi parlayan gözlər; 3. ulduzvarı, ulduzaoxşar, ulduzşəkilli, ulduz kimi

**starry-eyed** [.sta:rıˈaıd] *adj d.d.* xülyaçı, xəyalpərəst, mənasız, qeyri-real

**start**[1] [sta:t] *n* 1. başlanğıc, əvvəl; **from ~ to finish** əvvəldən axıra kimi; **to make a ~** başlamaq; *We can't finish the job today but we must make a star (on it) Biz bu gün işi qurtara bilmərik, lakin onu başlamalıyıq*; 2. yola düşmə, getmə; *We'll make an early start for town Səhər tezdən biz şəhərə yola düşəcəyik/gedəcəyik*; 3. *id.* start; **to line up for ~** start üçün cərgəyə/sıraya düzülmək; 4. səksənmə, diksinmə; sıçrama, sıçrayış; **to give a ~** səksənmək, diksinmək; **to give** ***smb.*** **a ~** bir kəsi səksəndirmək/diksindirmək/qorxutmaq; *You gave me a start Sən/Siz məni səksəndirdin/səksəndirdiniz*

**start**[2] [sta:t] *v* 1. *(həm də* **to ~ out***)* yola düşmək,



getmək; *The train has just started Qatar indicə yola düşüb/gedib*; **to ~ on a journey** səyahətə getmək; *He started for Turkey last week Keçən həftə o, Türkiyəyə getdi; We're going to start as early as possible Biz mümkün qədər tez yola düşmək fikrindəyik*; 2. başlamaq; **to ~ a quarrel** mübahisəyə başlamaq; *We must start work at once Biz dərhal işə başlamalıyıq*; 3. başlanmaq; *How did the war/ quarrel/ conversation start? Müharibə/ Mübahisə/ Söhbət necə başlandı?* 4. səksənmək, diksinmək; qorxmaq; *He starts at every noise O hər bir səsdən diksinir*; 5. diksindirmək; qorxutmaq; 6. sıçrayıb/atılıb qalxmaq; **to ~ from** ***one's*** **bed** sıçrayıb çarpayısından qalxmaq; **to ~ to** ***one's*** **feet** ayağı üstə atılmaq; **to ~ from sleep** qəflətən yuxudan oyanmaq; 7. laxlamaq; *His tooth started Onun dişi laxladı*; 8. çıxmaq; *His eyes started from their sockets Onun gözləri çuxurundan çıxdı, Onun gözləri kəlləsinə çıxdı*; 9. sel kimi axmaq, fışqırmaq; *Blood started from the wound Yaradan qan fışqırdı; Tears started from her eyes Onun gözlərindən yaş sel kimi axdı*; 10. tökmək; **to ~ the beer into a new cask** pivəni təzə çəlləyə tökmək; 11. becərmək, yetişdirmək; **to ~ chicks** cücə yetişdirmək/becərmək; 12. almaq, əldə etmək; **to ~ a horse/a car** at/maşın almaq; 13. *id.* yarışa/qaçışa başlamaq; start götürmək; *Five cars started but only three finished Beş maşın start götürdü, ancaq üçü finişə çatdı*; **to ~ a watch** saatı qurmaq; 14. qaldırmaq, irəli sürmək *(məsələ və s.)*; **to ~ a subject** məsələ qaldırmaq; 15. təsis etmək, açmaq, əsasını/təməlini/binasını qoymaq *(müəssisənin və s.)*; *He decided to start a newspaper O, qəzet təsis etməyi/buraxmağı qərara aldı*; **to ~ a new store** yeni mağaza açmaq; **to ~ back** geri sıçramaq; *He started back in fear O, qorxu içərisində geriyə atıldı/sıçradı/çəkildi*; **to ~ forward** irəli/qabağa atılmaq/sıçramaq

◊ **to ~ with** 1) hər şeydən əvvəl.../öncə...; 2) əvvəlcə, öncə, qabaqca

**starter** [ˈsta:təʳ] *n* 1. *id.* startçı *(yarışı başlamaq üçün işarə verən şəxs)*; 2. *id.* iştirakçı *(yarışda)*; 3. *tex.* starter *(avtomobil və təyyarə mühərrikini avtomatik işə salan qurğu)*; 4. iştaha açmaq üçün yeyilən xörək və s.

**starting-point** [ˈsta:tıŋpɔınt] *n* başlanğıc/çıxış nöqtəsi

**starting-post** [ˈsta:tıŋpoust] *n id.* start işarəsi/nişanı

**startle**[1] [ˈsta:tl] *n* qorxu, vahimə, hürkü, diksinmə

**startle**[2] [ˈsta:tl] *v* 1. qorxutmaq, hürkütmək, diksindirmək, qorxuya salmaq; *The sudden noise in the bush startled his horse Kolluqdakı qəfil səs onun atını hürkütdü*; 2. heyrətləndirmək, təəccübləndirmək, təəccüblənmək, heyrətə salmaq; *He was startled at the news Xəbər onu heyrətə saldı, Xəbərdən o heyrətləndi*; 3. həvəs oyatmaq, təhrik etmək *(bir işə)*; **to ~** ***smb.*** **into doing some work** bir kəsi bir iş görməyə təhrik etmək/həvəsləndirmək

**startled** [ˈsta:tld] *adj* qorxudulmuş, hürküdülmüş, qorxuya/hürküyə salınmış; **a ~ horse** hürküdülmüş at; **a ~ rabbit** qorxudulmuş krolik/ev dovşanı

**startling** [ˈsta:tlıŋ] *adv* heyrətləndirici, valehedici, sarsıdıcı; **~ events** sarsıdıcı hadisələr; **~ developments** heyrətləndirici müvəffəqiyyətlər/nailiyyətlər

**starvation**[1] [sta:ˈveıʃn] *n* aclıq, ac qalma, aclıq çəkmə; **to die of ~** aclıqdan/aclıq çəkməkdən ölmək

**starvation**[2] [sta:ˈveıʃn] *adj* son dərəcə az/cüzi; **~ wages** son dərəcə az əmək haqqı

**starve** [sta:v] *v* 1. acmaq, aclıq çəkmək; **to ~ to death** acından ölmək; 2. *d.d. (ancaq davamedici zaman formalarında işlənir)* ac olmaq, aclıq hiss etmək; *I'm simply starving Mən lap acından ölürəm*; **to be ~d** acından ölmək; *Some live in luxury, while others are starving Bziləri cah-calal içində yaşayır, digərləri acından ölür*; 3. *d.d.* çox arzu etmək, həsrətini çəkmək, ...həsrətində olmaq; *He's starving for knowledge O, elmin həsrətindədir, O, bilik almağı çox arzu edir/arzulayır*

**state**[1] [steıt] *n* 1. vəziyyət; **normal/bad/hopeless ~** normal/pis/ümidsiz vəziyyət; **~ of siege** mühasirə vəziyyəti; **~of emergency** fövqəladə vəziyyət; **~ of war** müharibə vəziyyəti; **~ of affairs/of things** işlərin vəziyyəti; **~ of health** sağlamlıq vəziyyəti; **to be in the ~ of shock** şok vəziyyətində olmaq; **to be in the ~ of undress** lüt/çılpaq vəziyyətdə olmaq; *The government declared a state of emergency after the earthquake Zəlzələdən sonra hökumət fövqəladə vəziyyət elan etdi*; 2. dövlət; **European ~s** Avropa dövlətləri; **the State of Israel** İsrail dövləti; **matters of ~** dövlət işləri; **a ~ within a ~** dövlət içində/içərisində dövlət; 3. ştat; **the State of Texas** Texas ştatı; **the States** Amerika Birləşmiş Ştatları

**state**[2] [steıt] *adj* dövlət; **~ service/bank** dövlət xidməti/bankı; **~ boundary** dövlət sərhədi; **~ treaty** dövlət müqaviləsi; **~ secrets** dövlət sirləri; **~ prison** dövlət həbsxanası *(siyasi dustaqlar üçün)*; **~ schools** dövlət məktəbləri; **a ~ pension** dövlət təqaüdü

**state**[3] [steıt] *v* 1. ifadə/şərh/izah/bəyan etmək, söyləmək; **to ~ the question** məsələni şərh/izah etmək; **to ~ a reason** səbəbi şərh/izah/bəyan etmək; **to ~ an opinion** fikri/rəyi bəyan/şərh etmək; 2. təsdiq/etiraf/qeyd etmək; *It's often stated that English weather is uncertain Çox vaxt deyirlər ki, İngiltərədə hava dəyişkəndir/sabit deyil*; 3. təyin etmək, müəyyənləşdirmək; **to ~ the time for a meeting/for a visit** iclas/görüş üçün vaxt təyin etmək

**state-crime** ['steɪtkraɪm] *n* dövlət cinayəti
**stated** ['steɪtɪd] *adj* müəyyənləşdirilmiş, müəyyən edilmiş; **at the ~ time/place** müəyyən edilmiş vaxtda/yerdə; **~ office hours** idarənin müəyyən edilmiş iş saatları; **a ~ meeting** müəyyən edilmiş iclas
**statehood** ['steɪthud] *n* dövlət müstəqilliyi/ statusu; dövlətçilik; **independent ~** dövlət müstəqilliyi
**stateless** ['steɪtlɪs] *adj* 1. dövlətsiz, dövlətçiliyi olmayan; 2. vətəndaşlığı olmayan; **a ~ person** vətəndaşlığı olmayan şəxs
**stately** ['steɪtlɪ] *adj* 1. əzəmətli, vüqarlı, böyük, möhtəşəm; **~ appearance** əzəmətli/vüqarlı görkəm; **a ~ lady** vüqarlı xanım; **a building of ~ proportions** möhtəşəm əndazəli bina; 2. lovğa, təkəbbürlü, iddialı, başqalarına xor baxan
**statement** ['steɪtmənt] *n* 1. demə, söyləmə *(öz fikrini, rəyini və s.)*, şərh/izah/ifadə etmə; şərh, izah; **an admirable ~ of the case** məsələnin parlaq/çox gözəl izahı; *A new statement of old truths is often necessary Çox vaxt köhnə həqiqətləri təkrar etmək lazımdır*; 2. bəyanat, fikir, müddəa, iddia; **to make a ~** bəyanat vermək; *This is unfounded statement Bu, əsassız bəyanatdır*; **formal ~** rəsmi bəyanat; 3. rəsmi hesabat, məlumat, siyahı; **monthly ~** aylıq məlumat/bülleten; **a ~ of equipment** avadanlıq siyahısı
**statesman** ['steɪtsmən] *n (pl* **-men** [-mən]) dövlət xadimi; siyasi xadim
**statesmanlike** ['steɪtsmənlaɪk] *adj* dövlət xadiminə/ siyasi xadimə yaraşan, dövlət xadimi kimi, siyasi xadim kimi; *He's a man of statesmanlike judgement O, dövlət xadimi kimi düşünən/fikirləşən adamdır*
**statesmanship** ['steɪtsmənʃɪp] *n* dövləti idarə etmə qabiliyyəti/bacarığı
**station¹** [steɪʃn] *n* 1. stansiya; **a railway/railroad ~** dəmiryol stansiyası; **a local radio ~** yerli /məhəlli radiostansiya; **a radar ~** radar stansiyası; **a nuclear power ~** atom elektrik stansiyası; **a meteorological/ seismological ~** meteoroloji/seysmik stansiya; 2. dayanacaq *(yolda)*; *I'll get off at the next station Mən növbəti /o biri dayanacaqda düşəcəm*
**station²** [steɪʃn] *v* 1. yerləşdirmək; *Their regiment is stationed in Spain Onların alayı İspaniyada yerləşdirilib*; 2. yerləşmək, oturmaq; *The police sergeant stationed himself by the door Polis serjantı qapının yanında oturdu*
**stationary** ['steɪʃənərɪ] *adj* 1. hərəkətsiz, tərpənməyən; **to remain ~** tərpənməmək, hərəkətsiz qalmaq; **a ~ target** tərpənməyən nişangah/hədəf; 2. bərkidilmiş; stasionar; **a ~ crane** stasionar kran; 3. həmişəlik, stabil, möhkəm, dəyişməz; **~ temperature** sabit/dəyişməz temperatur
**stationer** ['steɪʃnəʳ] *n* dəftərxana ləvazimatı satan *(adam)*
**stationmaster** ['steɪʃn,ma:stəʳ] *n* stansiya/vağzal rəisi
**statistical** [stə'tɪstɪkl] *adj* statistik; **~ evidence** statistik məlumat
**statistically** [stə'tɪstɪkəlɪ] *adv* statistik baxımdan/olaraq; *To make these results statistically valid, we need to question more people Bu nəticələrin statistik baxımdan doğru olması üçün biz daha çox adamla sorğu aparmalıyıq*
**statistics** [stə'tɪstɪks] *n* 1. statistika; 2. statistik məlumat
**statuary** ['stætʃərɪ] *n* 1. heykəltəraşlıq; **fine ancient pieces of ~** qədim heykəltəraşlığın gözəl nümunələri; 2. heykəltəraşlıq əsəri; **a collection of marble ~** mərmər heykəltəraşlıq əsərlərinin kolleksiyası
**statue** ['stætju:] *n* heykəl; **a bronze/marble ~** bürünc/mərmər heykəl
**statuesque** [,stætju'esk] *adj* 1. heykələoxşayan, heykəl şəklində; heykəl kimi donmuş; 2. əzəmətli, vüqarlı, möhtəşəm, böyük; boylu-buxunlu, qədd-qamətli, sərrast bədənli
**stature** ['stætʃəʳ] *n* 1. bədən, qamət, qədd-qamət, bədən quruluşu, boy-buxun; 2. ləyaqət, məziyyət; mənlik; keyfiyyət; **moral ~** mənəvi keyfiyyət, ləyaqət
**status** ['steɪtəs] *n (cəmdə dəyişmir)* 1. status; vətəndaşlıq vəziyyəti; **the ~ of a father/of a doctor** atanın / həkimin statusu; **diplomatic/ legal /international ~** diplomatik/qanuni/ beynəlxalq status; **the ~ of negotiations** danışıqların statusu; **to grant** *smb.* **refugee ~** bir kəsə qaçqın statusu vermək; *The teachers don't have a very high status in this country Bu ölkədə müəllimlərin statusu çox da yüksək deyil*; 2. ictimai vəziyyət, yüksək rütbə
**statute** ['stætʃu:t] *n* 1. əsas qanun; 2. nizamnamə
**statute-book** ['stætʃu:tbuk] *n hüq.* qanun külliyyatı/məcəlləsi
**staunch** [stɔ:ntʃ] *adj* **(-er, -est)** möhkəm, davamlı, dözümlü, səbatlı, mətin, sarsılmaz, yenilməz, qətiyyətli; **~ belief** möhkəm inam; **a ~ Christian** mətin/sarsılmaz/qətiyyətli xristian; **a ~ Republican** səbatlı/mətin/qətiyyətli respublikaçı; **a ~ supporter** möhkəm/yenilməz/səbatlı tərəfdar
**stave¹** [steɪv] *n* 1. uzun/möhkəm ağac, əsa, əl ağacı; 2. planka, tamaşa *(ensiz hamar lövhə)*; 3. çəlləkk taxtası; 4. beyt, bənd *(şerdə)*
**stave²** [steɪv] *v (pt, pp* **staved** *və ya* **stove** [stouv]) 1. dəlmək, deşmək; deşib keçmək *(çəlləyi; həm də* **to ~ in**); 2. dəlinmək, deşilmək; *The side of the boat was stove in when it hit the rocks Qayalara dəyəndə qayığın böyrü deşildi*; 3. çəlləkdəki taxtanı yenisi ilə əvəz etmək; **to ~ off** 1) qarşısını almaq; **to ~ off disaster/danger/bankruptcy/hunger** bədbəxtliyin/təhlükənin/iflasın/aclığın qarşısını almaq; 2) vaxtını dəyişmək, təxirə salmaq, vaxtını/möhlətini uzatmaq



**stay¹** [steɪ] *n* I 1. qalma, yaşama; **a long/a short /a week's ~ in London** Londonda uzun müddət/qısa müddət/bir həftəlik qalma; 2. ləngimə; yubanma, gecikmə; 3. ləngitmə, yubatma, gecikdirmə; **a ~ upon** *smb.'s* **activity** bir kəsin fəaliyyətini ləngitmə/yubatma; 4. dözümlülük, dözüm, davamlılıq, davam
**stay** [steɪ] *n* II 1. dayaq; **the only ~ of the family** ailənin yeganə dayağı; 2. *adət. pl* korset *(bədəni düz saxlamaq üçün geyilən kəmər)*
**stay²** [steɪ] *v* I 1. qalmaq; **to ~ (at) home** evdə qalmaq; **to ~ in the house/in** *one's* **room** evdə/otağında qalmaq; *Stay here with me Mənimlə qal/qalın; He stayed with us O bizimlə qaldı*; 2. qalmaq, qonaq olmaq, düşmək; **to ~ at/in a hotel** mehmanxanada qalmaq, mehmanxanaya düşmək; **to ~ with friends** dostlara qonaq olmaq; 3. dayandırmaq, qarşısını almaq; **to ~ bloodshed** qantökməni dayandırmaq; **to ~ the spread of disease** xəstəliyin yayılmasının qarşısını almaq; **to ~ the rise of prices** qiymətlərin yüksəlməsinin qarşısını almaq; 4. küsdürmək; **to ~** *one's* **appetite** iştahasını küsdürmək; 5. *d.d.* dözmək, tab gətirmək; geri qalmamaq; 6. qalmaq *(bir vəziyyətdə)*; **to ~ calm** sakit qalmaq;
◊ **to ~** *one's* **hand** əlini saxlamaq, hərəkətdən çəkinmək/vaz keçmək
**stay** [steɪ] *v* II 1. müdafiə/kömək etmək; 2. korseti bərkitmək
**stay-at-home** ['steɪəthoum] *n* xanənişin, evdə oturmağı sevən adam
**stayer** ['steɪəʳ] *n* 1. dözümlü adam/heyvan; 2. *id.* stayer *(uzaq məsafəyə qaçan idmançı)*
**stead** [sted] *n* 1. mülk, malikanə; 2. ferma; 3. torpaq sahəsi, tikinti üçün torpaq sahəsi
**steadfast** ['stedfa:st] *adj* 1. möhkəm, davamlı; **~ gaze** davamlı baxış; 2. sarsılmaz, səbatlı, mətin, möhkəm; **~ faith** sarsılmaz/möhkəm inam
**steady¹** ['stedɪ] *adj* 1. möhkəm, sarsılmaz, dayanıqlı, davamlı; **~ foundation** möhkəm özül /bünövrə; **~ faith** sarsılmaz/möhkəm inam; 2. daimi, sabit, stabil; **~ improvement** daimi dəyişiklik; **~ speed** sabit sürət; *Prices are steady Qiymətlər sabitdir*; 3. sadiq, etibarlı; **a ~ friend** sadiq/etibarlı dost
**steady²** ['stedɪ] *v* 1. möhkəmləndirmək, möhkəm etmək, bərkitmək; 2. möhkəmlənmək, möhkəm olmaq; 3. ciddiləşmək, ağıllanmaq
**steak** [steɪk] *n* qızartmaq üçün ət/balıq parçası
**steal¹** [sti:l] *n* 1. oğurluq; 2. oğurlanmış şey/əmlak
**steal²** [sti:l] *v (pt* **stole** [stoul]; *pp* **stolen** ['stoulən]) oğurlamaq; *My bicycle was stolen when I was on the shop Mən mağazada olanda velosipedimi oğurladılar*
**stealth** [stelθ] *n* biclik, hiyləgərlik, hiylə, fənd
**stealthy** ['stelθɪ] *adj* gizli, məxfi, üstüörtülü; **~ glance** gizli baxış/nəzər; **~ whisper** gizli/ məxfi pıçıltı
**steam¹** [sti:m] *n* 1. buxar, buğ; **dry/wet ~** quru/nəm buxar; **to put on ~** buğa vermək; 2. buxarlanma, buğlanma
**steam²** [sti:m] *v* 1. buğlanmaq, buxarlanmaq; *His wet clothes began to steam Onun yaş paltarları buxarlanmağa/buğlanmağa başladı*; 2. buğda bişirmək
**steamboat** ['sti:m,bout] *n* paroxod
**steamer** ['sti:məʳ] *n* paroxod
**steam-vessel** ['sti:m,vesl] *n* paroxod
**steel¹** [sti:l] *n* polad; *It's made of steel Bu, metaldan hazırlanıb*
**steel²** [sti:l] *adj* polad; **a ~ knife** polad bıçaq; **a ~ construction** polad konstruksiya; **a ~ tube /rope** polad boru/tros
**steel³** [sti:l] *v* 1. poladla örtmək, polad çəkmək; poladla qaynaq etmək; 2. bərkitmək *(poladı)*; 3. *məc.* sərtləşdirmək, amansızlaşdırmaq, mərhəmətsiz etmək; 4. *məc.* amansız/sərt olmaq, sərtləşmək, amansızlaşmaq; 5. bərkimək, möhkəmlənmək
**steel-clad** ['sti:lklæd] *adj* zirehli, zirehlə örtülmüş
**steel-hearted** ['sti:lha:tɪd] *adj* 1. cəsarətli, qoçaq, igid, cəsur, cürətli; 2. amansız, qəddar, daşürəkli, zalım, rəhmsiz
**steel-plated** ['sti:l'pleɪtɪd] *adj* zirehli, zirehlə örtülmüş, zireh çəkilmiş
**steely** ['sti:lɪ] *adj* 1. polad, poladdan düzəldilmiş/qayrılmış; 2. poladabənzər, poladaoxşar, polad kimi; 3. acıqlı, qaşqabaqlı; **a ~ glance** acıqlı/qaşqabaqlı baxış; 4. əyilməz, mətin, səbatlı, yenilməz
**steep¹** [sti:p] *n* I uçurum, sıldırım dərə; yarğan
**steep** [sti:p] *n* II salma, batırma *(mayeyə)*, islatma, suya qoyma
**steep²** [sti:p] *adj* **(-er, -est)** 1. dik, dimdik, sıldırım, yalçın; **a ~ roof/staircase** dik dam/pilləkən; **~ cliffs** yalçın/sıldırım qayalar; 2. *d.d.* həddən artıq, hədsiz; yüksək; **~ demands** yüksək tələblər; **~ prices** yüksək qiymətlər
**steep³** [sti:p] *v* 1. salmaq, batırmaq *(mayeyə)*; 2. islatmaq, suya qoymaq; **to ~ the vegetable for two hours in water** tərəvəzi iki saat suya qoymaq; 3. cövhərini almaq, şirəsini çıxarmaq; dəm almaq *(çay)*; **to ~ tea** çay dəmləmək; 4. qapılmaq; **to ~ oneself in a language** dil öyrənməyə qapılmaq; 5. canına çəkmək, hopdurmaq;
◊ **to ~** *one's* **hands in blood** əllərini qana bulamaq/batırmaq; **to be ~ed in tears** göz yaşlarına qərq olmaq
**steepen** ['sti:pən] *v* dikəlmək, dik qalxmaq; *The path steepens as you climb the mountain Dağa dırmaşdıqca cığır dikəlir*
**steepness** ['sti:pnɪs] *n* diklik, yoxuş, sıldırım
**steer¹** [stɪəʳ] *n* burulmuş/axtalanmış cöngə
**steer²** [stɪəʳ] *v* 1. idarə etmək *(sükanı)*; **to ~ a car /a ship** maşını/gəmini idarə etmək *(sürmək)*; 2. əməl/riayət etmək, getmək *(müəyyən yolla)*; to

**~ one's way** öz yolu ilə getmək; 3. rəhbərlik etmək, aparmaq; **to ~ a country to a peace** ölkəni sülhə aparmaq;
◊ **to ~ clear of** *smb./smth.* bir kəsdən/bir şeydən qaçınmaq/kənar gəzmək/çəkinmək
**steerable** ['stıərəbl] *adj* idarə olunan/oluna bilən
**steerage** ['stıərıdʒ] *n* 1. sükanı idarə etmə; sükanın hərəkəti; 2. idarə, rəhbərlik, idarə/rəhbərlik etmə
**steering** ['stıərıŋ] *n* 1. sükanı idarə etmə; 2. *av.* idarə etmə, sürmə *(təyyarəni və s.)*; 3. idarə oluna bilmə *(gəminin, maşının sükana tabe olma xassəsi)*
**steering-wheel** ['stıərıŋwi:l] *n tex.* şturval, sükan çarxı *(gəmidə, təyyarədə, avtomobildə)*
**steersman** ['stıəzmən] *n (pl* **-men** [-mən]) sükançı
**stellar** ['stelə<sup>r</sup>] *adj* 1. ulduz; **~ light** ulduz işığı; 2. ulduzabənzər, ulduzaoxşar, ulduzvarı *(xüs. kristal haq.)*; 3. *amer.* məşhur, tanınmış *(aktyor haq.)*
**stem**[1] [stem] *n* 1. *bot.* saplaq, gövdə *(bitkilərdə)*; **the ~ of a leaf/of an apple/of a plum** yarpağın/almanın/gavalının saplağı; 2. ayaq; **the ~ of a goblet/of a wine-glass** kubokun/qədəhin ayağı; 3. dəstək, sap; **the ~ of a knife** bıçağın sapı; **the ~ of a tobacco-pipe** qəlyanın sapı; 4. *dilç.* əsas *(sözdə)*
**stem**[2] [stem] *v* 1. bənd çəkmək, qabağını bağlamaq/kəsmək *(suyun)*; **to ~ a river** çayın qabağına bənd çəkmək; 2. saxlamaq, dayandırmaq; **to ~ the flow of blood** qanaxmanı dayandırmaq; **to ~ the enemy's attack** düşmənin hücumunu dayandırmaq; 3. axına qarşı üzmək, küləyə qarşı getmək və s.
**stembuilding** ['stembıldıŋ] *adj dilç.* əsasdüzəldən, əsasdüzəldici; **~ suffixes** əsasdüzəldən/əsasdüzəldici suffikslər
**stemware** ['stemweə<sup>r</sup>] *n* ayaqlı qablar *(bokal, qədəh və s.)*
**stench** [stentʃ] *n* üfunət, pis qoxu/iy
**stenchy** ['stentʃı] *adj* üfunətli, pis iyli/qoxulu, iyrənc
**stencil**[1] ['stensl] *n* 1. trafaret, qəlib; şablon,basmaqəlib; 2. naxış, bəzək, gül
**stencil**[2] ['stensl] *v* (**-ll-**) naxış vurmaq *(trafaretlə)*; **to ~ a fabric** çitə/parçaya naxış vurmaq
**stenograph**[1] ['stenəgra:f] *n* 1. stenoqram *(stenoqrafik yazı)*; 2. stenoqrafik işarələr
**stenograph**[2] ['stenəgra:f] *v* stenoqrafiyasını götürmək, stenoqrafiya üsulu ilə yazmaq
**stenographer** [ste'nɔgrəfə<sup>r</sup>] *n* stenoqrafist *(stenoqrafiya mütəxəssisi)*
**stenographic** ['stenou'græfık] *adj* stenoqrafik, stenoqrafiya
**stenographist** [ste'nɔgrəfist] *n* = **stenographer**
**stenography** [ste'nɔgrəfi] *n* stenoqrafiya
**step**[1] [step] *n* 1. addım; **a long/hesitating/short ~** uzun/inamsız/qısa addım; **back/side ~** geri /yana addım; **at every ~** hər addımda; **~ by ~** addımbaaddım, addım-addım, tədricən; 2. yaxın məsafə; *It's only a step to my house Mənim evimə cəmi bir addımdır; It's a long step to the river Çay uzaqdadır;* 3. yeriş; **light/heavy ~** yüngül/ağır yeriş; 4. irəliləyiş, irəliləmə; *We have made a great step forward in our negotiations Biz danışıqlarımızda böyük irəliləyiş əldə etmişik;* 5. vəzifədə irəliləyiş; **to get one's ~** vəzifədə irəliləmək; 6. hərəkət, addım; **a decisive/important ~** həlledici/vacib addım; **to make a false ~** səhv addım atmaq, səhv etmək; 7. pillə; **a marble/stone ~** mərmər/daş pillə; **to cut ~s in ice** buzda pillələr kəsmək;
◊ **to watch one's ~s** ehtiyatla hərəkət etmək, ehtiyatlı olmaq; *One step at a time* ≅ *Tələsən təndirə düşər*
**step**[2] [step] *v* (**-pp-**) 1. addımlamaq, yerimək; **to ~ lightly/heavily** yüngül/ağır addımlamaq; 2. (**over**) adlayıb/üstündən keçmək; adlamaq, keçmək, aşmaq *(bir şeyin üstündən)*; **to ~ over an obstacle** maneəni aşmaq; **to ~ over a stream** axını adlayıb keçmək; **to ~ across a road/across a street** yolu/küçəni keçmək; 3. rəqs etmək; *This girl can really step! Bu qız həqiqətən qəşəng rəqs edir!*; 4. (**on**) basmaq, tapdalamaq *(ayağı ilə)*; **to ~ on smb.'s foot** bir kəsin ayağını basmaq/tapdalamaq; 5. basmaq; **to ~ on the gas** 1) qaz vermək *(avtomobilə)*; 2) tələsmək; 5. addımla ölçmək *(həm də* **to ~ off/out**); **to ~ a distance** məsafəni addımla ölçmək; 6. pillə düzəltmək; **to ~ aside** 1) kənara çəkilmək/durmaq; 2) *məc.* başqasına yol vermək; **to ~ back** 1) geri durmaq/addım atmaq; 2) *məc.* güzəşt etmək, güzəştə getmək, təslim/tabe olmaq, razılaşmaq; **to ~ down** aşağı düşmək/enmək/addımlamaq; **to ~ off** *d.d.* hücuma atılmaq; **to ~ up** 1) pilləkənlə qalxmaq; 2) yaxınlaşmaq *(bir kəsə)*; **to ~ up to smb.** bir kəsə yaxınlaşmaq;
◊ **to ~ off on the wrong foot** lap əvvəldən səhv etmək; **to ~ on smb.'s toes** bir kəsin yaralı yerinə toxunmaq
**step-** [step-] *n Mürəkkəb isimlərin komponenti kimi işlənir və valideynlərin hər hansı birinin ikinci nikahdan sonra doğulan uşaqları ilə əvvəlki nikahdan olan uşaqları arasındakı əlaqəni, eləcə də həmin uşaqlarla valideynlərin qohumluq əlaqəsini bildirir. Azərbaycan türkcəsində* «ögey» sözünə və ya «**-lıq, -luq**» şəkilçilərinə uyğun gəlir: **step**father **ögey** ata, ata**lıq**; **step**daughter **ögey** qız, qız**lıq**, **step**son **ögey** oğul, oğul**luq** *və s.*
**stepbrother** ['step.brʌðə<sup>r</sup>] *n* ögey qardaş
**step-by-step** ['stepbaı'step] *adj* 1. pilləli; **a ~ rocket** pilləli roket; 2. addımbaaddım, tədricən, tədriclə, tədrici, yavaş-yavaş; **~ progress** tədrici tərəqqi/ irəliləmə
**stepdaughter** ['step.dɔ:tə<sup>r</sup>] *n* ögey qız, qızlıq
**stepfather** ['step.fa:ðə<sup>r</sup>] *n* ögey ata, atalıq
**stepladder** ['step.lædə<sup>r</sup>] *n* əl nərdivanı, asma nərdivan



**stepmother** ['step.mʌðə<sup>r</sup>] *n* ögey ana, analıq
**stepsister** ['step.sıstə<sup>r</sup>] *n* ögey bacı
**stepson** ['step.sʌn] *n* ögey oğul, oğulluq
**sterile** ['steraıl] *adj* 1. bəhərsiz, barsız, məhsul verməyən *(torpaq haq.)*; 2. sonsuz, uşağı olmayan *(adam haq.)*; 3. dölsüz, döl verməyən, qısır *(heyvan haq.)*; 4. nəticəsiz; **~ work** nəticəsiz iş; 5. maraqsız, darıxdırıcı, usandırıcı, cansıxıcı; **a ~ lecture** maraqsız/darıxdırıcı mühazirə; 6. *tib.* steril, mikroblardan təmizlənmiş; **~ bandages** steril sarğılar
**sterility** [ste'rılıtı] *n* 1. sonsuzluq, doğmazlıq, doğmama; qısırlıq; *The disease can cause sterility on men and women Xəstəlik kişilərdə və qadınlarda sonsuzluğa səbəb ola bilər*; 2. məhsulsuzluq, məhsul verməzlik, münbitsizlik *(torpaq haq.)*; 3. nəticəsizlik, səmərəsizlik, faydasızlıq; 4. mənasızlıq, maraqsızlıq, darıxdırıcılıq, usandırıcılıq; 5. sterillik, mikrobsuzluq
**sterilization, -isation** [.sterılaı'zeıʃn] *n* 1. sterilizasiya, mikrobsuzlaşdırma; 2. dölsüzləşdirmə, axtalama, burma
**sterilize, -ise** ['sterılaız] *v* 1. sterilizasiya etmək, sterilləşdirmək, mikrobsuzlaşdırmaq; **to ~ milk** südü sterilizasiya etmək; **to ~ surgical instruments** cərrah alətlərini sterilləşdirmək; 2. dölsüzləşdirmək, burmaq, axtalamaq; 3. maraqsızlaşdırmaq, usandırıcı/darıxdırıcı etmək
**sterilizer** ['sterılaızə<sup>r</sup>] *n* sterilizator *(sterilizasiya cihazı)*
**sterling**[1] ['stə:lıŋ] *n* sterlinq, funt sterlinq *(Britaniyada pul vahidi)*
**sterling**[2] ['stə:lıŋ] *adj* qüsursuz, eyibsiz, nöqsansız, mükəmməl, etibarlı; xalis; **a man of ~ character** nöqsansız xarakterli/etibarlı adam
**stern** [stə:n] *adj* 1. sərt; **a ~ coast/look/face** sərt sahil/baxış/sifət; 2. ciddi; **a ~ father/judge** ciddi ata/hakim; **a ~ punishment** ciddi cəza; 3. amansız; **a ~ battle** amansız döyüş; 4. möhkəm, mətanətli, yenilməz; **a ~ follower** mətanətli/yenilməz davamçı
**stew**[1] [stju:] *n* buğda bişirilmiş ət/balıq/tərəvəz və s.; **a beef ~** buğda bişirilmiş mal əti
**stew**[2] [stju:] *v* 1. pörtlətmək, buğda bişirmək; 2. pörtlədilmək, buğda bişirilmək
**stewed** [stju:d] *adj* 1. pörtlədilmiş, buğda bişirilmiş; **~ vegetable** pörtlədilmiş tərəvəz; 2. çox dəmdə qalmış *(çay)*
**stick**[1] [stık] *n* 1. ağac; dəyənək; 2. əsa, əl ağacı; 3. plitka; **a ~ of chocolate** bir plitka şokolad; 4. *mus.* kaman yayı; 5. dirijor çubuğu; 6. *id.* hokkey ağacı; 7. *bot.* budaq; 8. *amer. d.d.* daldabucaq, mədəni mərkəzdən uzaq yer;
◊ **the big ~** güc siyasəti; **to use big ~ methods** güc siyasəti işlətmək/yeritmək; **to have the right end of the ~** üstünlük əldə etmək; **to have the wrong end of the ~** məğlubiyyətə düçar olmaq
**stick**[2] [stık] *v (pt, pp* **stuck** [stʌk]) I 1. (**in, into**) sancmaq, batırmaq, soxmaq, çaxmaq; **to ~ a spade into the earth** beli torpağa sancmaq; **to ~ a needle into one's finger** iynəni barmağına batırmaq; **to ~ a knife into smb.** bir kəsə bıçaq soxmaq; *Don't stick your nose into other people's business Burnunu/Burnunuzu başqa adamların işinə soxma/soxmayın*; 2. sancılmaq, batmaq; *The arrow stuck into the target Ox hədəfə sancıldı; The needle stuck in my finger İynə mənim barmağıma batdı*; 3. öldürmək *(ucu şiş silahla)*; **to ~ smb. with a bayonet** bir kəsi süngü ilə öldürmək; 4. kəsmək *(heyvanı)*; **to ~ a pig** donuz kəsmək; 5. *d.d.* çıxarmaq; **to ~ one's head/one's hand out of the window** başını/əlini pəncərədən çıxarmaq; 6. *d.d.* taxmaq; **to ~ a flower in one's hair** saçına çiçək/gül taxmaq; **to ~ a feather in a cap** papağa lələk taxmaq; **to ~ a revolver in one's belt** toqqasına/kəmərinə tapança taxmaq; 7. *d.d.* qoymaq, atmaq; *Just stick it on the table Onu stolun üstünə at/atın*; **to ~ out** 1) dik çıxmaq, dik/vız durmaq; *His ears stick out Onun qulaqları dik durur*; 2) irəli vermək/çıxartmaq; **to ~ out one's chest** döşünü irəli vermək; **to ~ out one's tongue** dilini çıxartmaq; **to ~ out one's tongue at smb.** bir kəsə dilini çıxartmaq
**stick** [stık] *v (pt, pp* **stuck** [stʌk]) II 1. yapışdırmaq, vurmaq; **to ~ a lable on one's luggage** yükünün üstünə yarlık yapışdırmaq/vurmaq; **to ~ a stamp on a letter** məktubun üstünə marka vurmaq/yapışdırmaq; **to ~ a notice on a wall** divara elan vurmaq/yapışdırmaq; **to ~ photographs in an album** alboma fotoşəkillər yapışdırmaq; 2. yapışmaq; *This envelope won't stick Bu zərf yapışmır; These stamps have stuck (together) Bu markalar (bir yerə) yapışıb; The vegetables have stuck to the pan Tərəvəzlər qazana yapışıb*; 3. bərk, bərk-bərk yapışmaq; **to ~ on the horse** yəhərdən bərk-bərk yapışmaq; 4. ilişmək, ilişib qalmaq; *The car stuck in the mud Avtomobil ilişib palçıqda qaldı; We had stuck there for a week by bad weather Havanın pisliyi ucbatından biz bir həftə ilişib orada qaldıq*; 5. dayanmaq; **to ~ in the middle of a speech** nitqin ortasında dayanmaq; 6. *d.d.* çətin vəziyyətə salmaq; *This problem sticks me Bu problem məni çətin vəziyyətə salır*; 7. *d.d.* aldatmaq; *He had already been stuck several times by this man Bu adam artıq onu bir neçə dəfə aldatmışdı*; **to ~ around** qalmaq, getməmək; *Somebody has to stick around and feed the dog Kimsə qalıb iti yemləməlidir*; **to ~ together** bir yerə yapışdırmaq; **to ~ broken pieces together with glue** sınıq parçaları yapışqanla bir yerə yapışdırmaq;
◊ **to be stuck on smb.** bir kəsi sevmək, bir kəsə vurulmaq; **to ~ to one's last** öz işi ilə məşğul olmaq, başqasının işinə qarışmamaq
**sticker** ['stıkə<sup>r</sup>] *n* 1. yapışdıran vasitələr; 2. yarlık; afişa, elan; 3. afişa yapışdıran

**sticky** ['stɪkɪ] *adj* (**-ier, -iest**) 1. yapışan, yapışqanlı; ~ **fingers** yapışan/yapışqanlı barmaqlar; 2. nəm; a ~ **August evening** nəm avqust axşamı; 3. tərli; *I'm all hot and sticky after my game of tennis Tennis oynadıqdan sonra mən bərk istilənmişəm və yapışqan kimiyəm*; 4. çətin, xoşagəlməz; a ~ **situation** çətin/xoşagəlməz vəziyyət

**stiff** [stɪf] *adj* (**-er, -est**) 1. möhkəm, bərk, sərt; cod, qaba; a ~ **brush** sərt/cod fırça; ~ **cardboard** bərk karton; 2. donmuş, keyimiş; **to be ~ with cold** soyuqdan keyləşmək/keyimək; *My legs feel stiff Mənim ayaqlarım tamam keyləşib*; 3. gərgin, qeyri-sərbəst, zorla; a ~ **face** gərgin sifət; a ~ **smile** zorla gülümsəmə; 4. pis hərəkət edən; *The door is stiff Qapı açılmır*; 5. qatı; ~ **dough** qatı xəmir; 6. amansız, qızğın, şiddətli, kəskin; a ~ **battle** amansız/ qızğın/ şiddətli döyüş; a ~ **fight** amansız/qızğın/şiddətli/ kəskin mübarizə; 7. bərk *(torpaq haq.)*; 8. güclü *(külək haq.)*; 9. bərk təsir edən, çox güclü *(dərman haq.)*; 10. ciddi, şiddətli, sərt, ağır *(cəza haq.)*

**stiffen** ['stɪfn] *v* 1. bərkitmək, codlaşdırmaq, sərtləşdirmək; cod/sərt etmək; 2. codlaşmaq, sərtləşmək; bərkimək; suvaşqanlığını artırmaq, qatılaşdırmaq; **to ~ milk with flour** südə un qatmaqla qatılaşdırmaq; 3. qatılaşmaq, bərkimək; 4. ruhlandırmaq; *He tried to stiffen his soldiers O, əsgərlərini ruhlandırmağa çalışdı*; 5. keyimək, donmaq; *My hands stiffen with cold Əllərim soyuqdan keyiyir/donur*; 6. keyitmək, keyləşdirmək *(hissi)*; 7. çətinləşdirmək *(imtahanı və s.)*; çətinləşmək; 8. amansızlaşmaq, şiddətlənmək, qızışmaq *(mübarizə və s. haq.)*; 9. qalxmaq, yüksəlmək *(qiymət haq.)*; 10. yüksəltmək, qaldırmaq *(qiyməti)*

**stiff-necked** ['stɪfnekt] *adj* 1. tərs, inad, inadcıl, inadkar, kəc; 2. lovğa, təkəbbürlü, iddialı, mütəkəbbir, başqalarına xor baxan, heç kəsi bəyənməyən

**stiffness** ['stɪfnɪs] *n* 1. *tib.* hərəkətsizlik, tərpənməzlik; donuqluq; 2. qatılıq, qəlizlik

**stifle** ['staɪfl] *v* 1. boğmaq; *The gas stifled them Qaz onları boğdu*; 2. boğulmaq; **to ~ from want of air** havasızlıqdan boğulmaq; **to be ~d by smoke/gas** tüstüdən/qazdan boğulmaq; *We were stifling in that hot room with all the windows closed Bütün pəncərələri bağlı olan o isti otaqda biz boğulurduq*; 3. yatırtmaq, susdurmaq; sakitləşdirmək; **to ~ a revolt** üsyanı/qiyamı yatırtmaq; 4. batırmaq; **to ~ a noise** səsi batırmaq; 5. üstünü örtmək, ört-basdır etmək; **to ~ a fact** faktın üstünü örtmək, faktı ört-basdır etmək; 6. gizlətmək; **to ~ a document** sənədi gizlətmək; 7. söndürmək *(yanğını)*

**stifling** ['staɪflɪŋ] *adj* boğanaq, bürkülü, ağır; a ~ **room** boğanaq otaq; ~ **heat** bürkülü isti; *It's stifling here – let's open the windows Bura çox boğanaqdır – gəl/gəlin pəncərələri açaq*

**stigma** ['stɪgmə] *n* 1. üzüqaralıq, rüsvayçılıq, bədnamlıq, biabırçılıq; 2. ləkə, yara *(bədəndə)*

**stigmatize, -ise** ['stɪgmətaɪz] *v* biabır/rüsvay /bədnam etmək

**stile** [staɪl] *n* hasardan və ya divardan aşmaq üçün pillələr

**stiletto** [stɪ'letou] *n* (*pl* **-oes** [ouz]) xəncər; stilet *(üçtiyəli kiçik xəncər)*

**still¹** [stɪl] *n* I *şair.* sakitlik, sükut, səssizlik; **in the ~ of the night** gecənin sakitliyində/sükutunda

**still** [stɪl] *n* II 1. distillator *(mayeni distillə edən cihaz)*; 2. araq zavodu

**still²** [stɪl] *adj* (**-er, -est**) 1. sakit, tərpənməz; ~ **water of the lake** gölün sakit suyu; a ~ **rain** sakit yağış *(küləksiz)*; *The woods were still Meşə sakit idi/sakitliyə qərq olmuşdu*; **to keep/to stay ~** sakit dayanmaq/durmaq; 2. səssiz, sakit; a ~ **night** səssiz/sakit gecə; 3. alçaq; a ~ **voice** alçaq səs; 4. köpüklənməyən *(şərab haq.)*;

◊ **(as) ~ as death/as the grave** ölü/qəbir kimi sakit; ~ **watches of the night** gecənin sükutu; **to keep a ~ tongue in one's head** dilini sakit saxlamaq, susmaq; *Still waters run deep at. söz.* ≅ *Suyun lal axanı, adamın yerə baxanı*

**still³** [stɪl] *v* I 1. sakitləşdirmək, susdurmaq, sakit/təskin etmək; *The food stilled the baby Yemək uşağı sakitləşdirdi*; 2. susmaq, sakitləşmək; *The wind was stilled Külək sakitləşdi*; 3. yatırtmaq, yatmaq, dayandırmaq, dayanmaq; **to ~ pain** ağrını yatırmaq/dayandırmaq; *The storm had stilled Tufan yatdı/dayandı*

**still** [stɪl] *v* II distillə etmək, saflaşdırmaq

**still⁴** [stɪl] *adv* 1. sakit, hərəkətsiz, yavaş, yavaş-yavaş, aramla; **to stand ~** sakit/hərəkətsiz dayanmaq; *Sit still! Sakit otur!/oturun!*; 2. hələ də, əvvəlki kimi; *He's still busy O hələ də məşğuldur*; *They are still working Onlar hələ də işləyirlər*; *It's still raining Hələ də yağış yağır*; 3. yenə də, bununla belə; *Though she felt ill, she still went to work Özünü xəstə hiss etməyinə baxmayaraq, yenə də o, işə getdi*

**still⁵** [stɪl] *conj* lakin, ancaq, amma, bununla belə; *The pain was bad, still he did not complain Ağrı bərk idi, lakin/amma/ancaq o, şikayət etmədi*; *He has many faults, still I love him Onun nöqsanları çoxdur, bununla belə mən onu sevirəm*

**stillbirth** ['stɪlbə:θ] *n* ölü doğulmuş döl/uşaq

**stillborn** ['stɪlbɔ:n] *adj* ölü doğulmuş

**stillness** ['stɪlnɪs] *n* hərəkətsizlik, sakitlik, səssizlik, sükut

**stilt¹** [stɪlt] *n* 1. ağacayaq; 2. *tik.* dayaq, dirək; **to built a house on ~s** dayaqlar üzərində ev tikmək

**stilt²** [stɪlt] *v* ağacayaqla gəzmək

**stilted** ['stɪltɪd] *adj* 1. ağacayaqla gəzən; 2. təmtəraqlı, dəbdəbəli; təntənəli, ibarəli; qeyri-təbii; ifrat dərəcədə ciddi/zabitəli, rəsmiyyətpərəst

**stimulant¹** ['stɪmjulənt] *n* 1. *tib.* gücləndirən, qızışdıran, fəaliyyəti artıran vasitə; 2. spirtli içki; **to take ~s** spirtli içkilər içmək



**stimulant²** ['stɪmjulənt] *adj* oyadan, hərəkətə gətirən, gücləndirən, qızışdıran, fəaliyyəti artıran, həvəsləndirən, həvəsə gətirən

**stimulate** ['stɪmjuleɪt] *v* 1. oyatmaq, həyəcanlandırmaq, həyəcana gətirmək; qıcıqlandırmaq; həvəsləndirmək, həvəsə gətirmək; stimul yaratmaq; 2. spirtli içki vasitəsilə oyatmaq/həvəsləndirmək

**stimulation** [ˌstɪmju'leɪʃn] *n* 1. oyanma, oyatma, hərəkətə gətirmə; həyəcan, həvəs, ehtiras; stimulyasiya; 2. həvəsləndirmə, rəğbətləndirmə, şirnikləndirmə; bəxşiş, mükafat

**stimuli** ['stɪmjulaɪ] **stimulus** *isminin cəmi*

**stimulus** ['stɪmjuləs] *n* (*pl* **-li**) 1. stimul *(hərəkətverici səbəb)*; 2. stimullaşdırıcı təsir

**sting¹** [stɪŋ] *n* 1. neştər, iynə *(arılarda, əqrəblərdə və s.)*; *The sting of a scorpion is in its tail Əqrəbin neştəri/iynəsi quyruğundadır*; 2. dalama *(gicitkəndə)*; 3. zəhərlilik, kəskinlik, acılıq *(sözdə, tənədə)*; 4. əzab, kəskin ağrı; **the ~ of hunger** aclığın əzabı; **the ~s of remorse** vicdan əzabı

**sting²** [stɪŋ] *v* (*pt, pp* **stung** [stʌŋ]) 1. sancmaq, vurmaq, çalmaq; dişləmək; *A beer stung me on the cheek Arı mənim yanağımdan sancdı/vurdu*; 2. ayışmaq, acışmaq; *My eyes are stinging from the smoke Tüstüdən mənim gözlərim ayışır*; 3. incitmək, əzab vermək; *His conscience stings him Vicdanı onu incidir/ona əzab verir*; 4. əzab /əziyyət/iztirab çəkmək, kəskin ağrı hiss etmək; 5. oyatmaq, təhrik/məcbur etmək; *Hunger stung him to action Aclıq onu hərəkətə gətirdi/təhrik etdi*;

◊ *Nothing stings like the truth* ≅ *Həqiqət hər şeydən acı olur*

**stinger** ['stɪŋəʳ] *n* 1. dalayan bitki / həşərat; 2. neştər, iynə *(arılarda və s.)*; 3. kəskin zərbə; 4. acı cavab; 5. inandırıcı dəlil

**stinging** ['stɪŋɪŋ] *adj* 1. sancan, yandıran; 2. acı, zəhərli, kəskin; ~ **words** acı/zəhərli/kəskin sözlər; a ~ **satire** acı/kəskin satira; a ~ **tongue** acı dil

**stinging nettle** ['stɪŋɪŋˌnetl] *n bot.* dalayan gicitkən

**stingy** ['stɪndʒɪ] *adj* 1. xəsis, simic, dargöz; a ~ **man** xəsis/simic adam; *He's a bit stingy O, bir az xəsisdir/simicdir*; 2. az, zəif, kasıb, az-maz

**stink¹** [stɪŋk] *n* pis iy/qoxu, üfunət; *What a stink! Bu nə pis iydir!/üfunətdir!*

**stink²** [stɪŋk] *v* (*pt* **stank** [stæŋk] *və ya* **stunk** [stʌŋk], *pp* **stunk** [stʌŋk]) pis/üfunət iylənmək; *The fish has gone bad – it stinks Balıq xarab olub – üfunət iylənir*

**stint¹** [stɪnt] *n* 1. məhdudiyyət; məhdudlaşdırma; **without ~** məhdudiyyət qoymadan, həddən artıq; **to work without ~** həddən artıq işləmək; **to spend money without ~** pulu həddən artıq xərcləmək/dağıtmaq; 2. dərs; **to do one's daily ~** gündəlik dərsini etmək; 3. pay, norma; **to appoint/to set a ~** payı/normanı təyin etmək

**stint²** [stɪnt] *v* 1. kəsmək, azaltmaq, məhdudlaşdırmaq; əsirgəmək, qıymamaq; xəsislik/simiclik etmək; **to ~ oneself for one's children** uşaqlarının xatirinə özünə qıymamaq/əsirgəmək; **not to ~ smth.** heç nədə xəsislik/simiclik etməmək; 2. dərs vermək, dərsə aid iş vermək

**stipend** ['staɪpend] *n* 1. maaş, məvacib, aylıq, donluq *(xüs. müəllimlərə, məmurlara, keşişlərə verilən)*; əməyə görə muzd/haqq/mükafat; 2. müavinət; təqaüd

**stipendiary** [staɪ'pendjərɪ] *adj* 1. haqqı ödənilən; 2. maaş/məvacib/donluq alan

**stipulate** ['stɪpjuleɪt] *v* şərt qoymaq, şərtləndirmək, asılı etmək; *He stipulates three things before he can agree to go O, getməzdən əvvəl üç şərt qoyur*

**stipulation** [ˌstɪpju'leɪʃn] *n* şərt, qeyd-şərt, qeyd; *Under/On the stipulation that... Bu şərtlə ki,...*; *I can go there under/on the stipulation that you can give me your car Mən ora bu şərtlə gedərəm ki, sən/siz maşınını/maşınınızı mənə verəsən/verəsiniz*

**stir¹** [stə:ʳ] *n* 1. hərəkət, tərpənmə, tərpətmə, tərpəniş; 2. çalxama, çalxalama, qarışdırma; **to give the mixture a few ~s** miksturanı bir az qarışdırmaq/çalxalamaq; **to give the fire a ~** ocağı qarışdırmaq; **to give one's coffee a ~** kofesini qarışdırmaq; 3. qarışıqlıq, çaxnaşma, hərc-mərclik, hay-küy, mərəkə, vəlvələ, qaçaqaç; **to cause a ~** çaxnaşma/hərc-mərclik/hay-haray salmaq

**stir²** [stə:ʳ] *v* (**-rr-**) 1. qarışdırmaq; **to ~ one's tea /one's coffee** çayını/qəhvəsini qarışdırmaq; *I've put sugar into your tea but I haven't stirred it Mən sənin/sizin çayına/çayınıza qənd salmışam, lakin qarışdırmamışam*; 2. tərpətmək; *The wind stirred the leaves Külək yarpaqları tərpətdi*; 3. tərpənmək; *Nothing was stirring around Ətrafda heç nə tərpənmirdi*; 4. həyəcanlandırmaq, oyatmaq, coşdurmaq; **to ~ the blood** qanı coşdurmaq; **to ~ smb.'s wrath** bir kəsin qəzəbini coşdurmaq; **to ~ smb.'s passions** bir kəsin ehtirasını coşdurmaq/oyatmaq; 5. həyəcanlanmaq, coşmaq, cuşa/həvəsə gəlmək; **to ~ up** 1) yaxşı-yaxşı qarışdırmaq; 2) oyatmaq, coşdurmaq *(maraq və s. haq.)*; **to ~ up smb.'s courage** bir kəsin cəsarətini coşdurmaq, bir kəsdə həvəs oyatmaq; 2) qızışdırmaq; artırmaq; **to ~ up hatred** nifrəti qızışdırmaq/artırmaq;

◊ **not to ~ an eyelid** gözünü belə yummamaq; **not to ~ a finger** heç barmağını tərpətməmək

**stirless** ['stə:lɪs] *adj* hərəkətsiz, tərpənməyən, qımıldanmayan, sakit

**stirrer** ['stə:rəʳ] *n* 1. araqızışdıran, aravuran; 2. *tex.* qarışdıran *(maşın)*; 3. mayeni qarışdırmaq üçün ağac və s.

**stirrup** ['stɪrəp] *n* üzəngi; *Put your feet in the stirrup Ayaqlarını/Ayaqlarınızı üzəngiyə qoy/qoyun*

**stitch¹** [stɪtʃ] *n* 1. sırıqarası, tikişarası; 2. ilgək; **to drop/to take up a ~** ilgək buraxmaq /götür-

mək; 3. *tib.* tikiş; **to put ~es in a wound** yaraya tikişlər qoymaq; 4. böyürdə kəskin ağrı *(həm də* **a ~ in the side**); *I ran so fast that I have a stitch in the side Mən elə bərk qaçdım ki, böyrüm ağrıyır/sancır*; **not to have a ~ on, to be without a ~ of clothing** tamamı lüt/çılpaq olmaq

**stitch²** [stɪtʃ] *v* 1. tikmək *(paltar, ayaqqabı və s.)*; 2. sırımaq; 3. naxış tikmək/getmək; 4. *tib.* tikiş qoymaq

**stock¹** [stɔk] *n* 1. əsas gövdə *(ağacda)*; 2. *məc.* küt, gic, kütbeyin, qanmaz, səfeh; **to stand like a ~** gic/küt/qanmaz kimi dayanmaq; 3. at nallamaq üçün dəzgah; 4. kök, əmələgəlmə mənbəyi; ulu babalar, əcdad; **the ~ of all mankind** bütün bəşəriyyətin əcdadı; 5. şəcərə, nəsil şəcərəsi/tarixi; 6. nəsil, ailə; **to come/to be of good ~** yaxşı ailədən/nəsildən olmaq; 7. ehtiyat, fond; **new/fresh ~** təzə ehtiyat; **a ~ of wood** odun ehtiyatı; **a ~ of information** məlumat fondu; **to lay in a ~** ehtiyat yaratmaq/yığmaq; **to exhaust the ~** ehtiyatı tükətmək; 8. assortiment, çeşid; **to renew ~** assortimenti/çeşidi təzələmək; 9. inventar, avadanlıq; 10. park *(avtomobil və s. üçün)*; 11. kapital, yatırım; 12. səhm; **to take ~ in** səhm almaq; 13. istiqraz, qiymətli kağız; 14. bir dəst oyun kartı

**stock²** [stɔk] *adj* 1. standart; **~ size** standart ölçü; *He's of stock size Onun ölçüsü standartdır*; 2. şablon, adi, bayağı, çeynənmiş; **a~ phrase / joke /argument** çeynənmiş ifadə/zarafat/dəlil; 3. birja; **a ~ agreement** birja sazişi/razılaşması; 4. maldarlıq, heyvandarlıq; 5. tayfa; **~ customs** tayfa adətləri; 6. hazır *(dərman haq.)*

**stock³** [stɔk] *v* 1. təmin/təchiz etmək; **to ~ a farm** təsərrüfatı təchiz etmək; **to ~ a shop** mağazanı təchiz etmək; 2. satışda olmaq; 3. anbarda saxlamaq; ehtiyatı olmaq; 4. ehtiyat yaratmaq; 5. çıxartmaq *(ağacların kötüyünü)*; 6. alaq etmək/eləmək, alaq vurmaq; 7. yeni zoğ/cavan budaq vermək

**stocked** [stɔkt] *adj* təmin/təchiz olunmuş; **a well ~ shop/library** yaxşı təchiz olunmuş mağaza/kitabxana

**stock beet** [ˈstɔkbi:t] *n bot.* yem çuğunduru

**stock-breeder** [ˈstɔk.bri:dəʳ] *n* heyvandar, heyvandarlıq mütəxəssisi

**stock-broker** [ˈstɔk.broukəʳ] *n* birja dəllalı

**stockbroking** [ˈstɔk.broukɪŋ] *n* birja dəllallığı

**stockholder** [ˈstɔk.houldəʳ] *n* səhmdar, səhm sahibi

**stocking** [ˈstɔkɪŋ] *n* corab, uzunboğaz corab; **a pair of silk/woolen/cotton ~s** bir cüt ipək /yun /pambıq corab

**stockman** [ˈstɔkmən] *n (pl* **-men** [-mən]) 1. heyvandarlıq fəhləsi; 2. = **stock-breeder**

**stockpile¹** [ˈstɔkpaɪl] *n* ehtiyat, rezerv

**stockpile²** [ˈstɔkpaɪl] *v* ehtiyat yığmaq

**stock-room** [ˈstɔkru:m] *n* anbar

**stock-still** [.stɔkˈstɪl] *adv* hərəkətsiz, tərpənmədən, hərəkətsiz halda; **to remain/to stand /to stay ~** hərəkətsiz (halda) qalmaq/dayanmaq/durmaq

**stock-taking** [ˈstɔk.teɪkɪŋ] *n* 1. inventarın/əmlakın yenidən hesaba alınması/yoxlanılması; 2. gözdən keçirmə, xülasə, tənqidi təhlil

**stock-whip** [ˈstɔkwɪp] *n* çoban qamçısı/şallağı

**stocky** [ˈstɔkɪ] *adj* **(-ier, -iest)** enlikürək *(adam)*, pota; **a ~ man** pota adam

**stockyard** [ˈstɔkja:d] *n* mal-qara saxlanılan yer, ağıl

**stodge¹** [stɔdʒ] *n* 1. yapışqan kimi palçıq; 2. ağır doyumcul yemək; **to have a good ~** doyunca /boğaza çıxınca yemək

**stodge²** [stɔdʒ] *v* 1. ağzına qədər doldurmaq; 2. görməmiş kimi/acgözlüklə yemək; 3. palçığa ilişib qalmaq/batmaq; palçıqdan güc-bəla ilə çıxmaq; 4. cansıxıcı/yeknəsəq iş görmək

**stodgy** [ˈstɔdʒɪ] *adj* 1. ağır, qatı *(yemək haq.)*; 2. maraqsız, usandırıcı, yorucu; **a ~ book** maraqsız kitab; **a ~ lecture** maraqsız mühazirə; 3. ağır, ağırtərpənən; kök, yoğun, tosqun *(adam haq.)*; **a ~ man** ağırtərpənən/tosqun adam

**stoke** [stouk] *v (həm də* **to ~ up**) ocağı sönməyə qoymamaq; ocağa yanacaq əlavə etmək, ocağa yanacaq tökə-tökə qarışdırmaq

**stoker** [ˈstoukəʳ] *n* ocaqçı, külxanaçı

**stole** [stoul] **to steal** *felinin pt formasi*

**stolen** [stouln] **to steal** *felinin pp forması*

**stomach¹** [ˈstʌmək] *n* 1. mədə; **a disordered ~** pozulmuş mədə; **pain in the ~** mədədə ağrı; **on an empty ~** acqarına; **to have a ~ upset** mədəsi pozulmaq; 2. qarın; **to crawl upon *one's* ~** qarnıüstə sürünmək; 3. həvəs, meyl, maraq; **to have no ~ for *smth.*** bir şeyə həvəsi/meyli/marağı olmamaq; **to have no ~ for fighting/for a fight** davaya/dava-dalaşa həvəsi/meyli olmamaq;

◊ **proud/high ~** lovğalıq, iddialılıq, təkəbbürlülük, özündən razılıq

**stomach²** [ˈstʌmək] *v* 1. yemək/həzm etmək iqtidarında olmaq; 2. səbir etmək, dözmək, davam gətirmək; **to ~ *smth.*** bir şeyə dözmək; **to ~ an insult** təhqirə dözmək; 3. ürəkbulanması törətmək/yaratmaq

**stomach-ache** [ˈstʌməkeɪk] *n* mədə ağrısı

**stone¹** [stoun] *n* 1. daş; **a pile of ~s** bir qalaq/yığın/topa daş; **to throw a ~ at *smb.*** bir kəsə daş atmaq; *He threw a stone at the dog O, itə daş atdı*; **a road covered with ~s** daşla örtülmüş yol; 2. daş *(tikinti materialı)*; **a house built of ~** daşdan tikilmiş ev; 3. qiymətli daş *(həm də* **precious ~**); 4. çəyirdək *(gilasda, gavalıda, ərikdə və s.)*; 5. *tib.* daş *(öd kisəsində, böyrəkdə)*; **kidney ~s** böyrək daşları

**stone²** [stoun] *adj* daş; **a ~ wall/building/floor** daş divar/bina/döşəmə

**stone³** [stoun] *v* 1. daşlamaq, daş atmaq; daşla döymək/vurmaq; **to ~ *smb.* to death** bir kəsi



ölüncə/ölənə qədər daşla döymək; 2. daşdan üz çəkmək; **to ~ a wall** divara daşdan üz çəkmək; 3. çəyirdəyini çıxartmaq *(meyvənin)*; **to ~ fruit** meyvənin çəyirdəyini çıxartmaq

**Stone Age** [ˈstouneɪdʒ] *n* daş dövrü

**stone-axe** [ˈstounˈæks] *n* 1. daş balta; 2. daş yonmaq üçün balta

**stone-breaker** [ˈstoun.breɪkəʳ] *n* 1. daşqıran fəhlə; 2. daşdoğrayan maşın

**stone-cutter** [ˈstoun.kʌtəʳ] *n* 1. daş oymaçısı, daş üzərində naxış açan usta; 2. daşyonan usta

**stone-deaf** [ˈstounˈdef] *adj* tamam kar

**stone-fruit** [ˈstounfru:t] *n* çəyirdəkli meyvə

**stonemason** [ˈstoun.meɪsn] *n* bənna

**stone-pit** [ˈstounpɪt] *n* daş karxanası

**stony** [ˈstounɪ] *adj* 1. daşlı; **~ ground** daşlı torpaq; **a ~ beach** daşlı çimərlik; 2. *məc.* daş, hissiz, sərt, amansız, rəhmsiz; **~ heart** daş ürək; 3. soyuq, hərəkətsiz; **~ look** soyuq baxış

**stony-hearted** [ˈstounɪ.ha:tɪd] *adj* daşürəkli, rəhmsiz, zalım

**stood** [stu:d] **to stand** *felinin pt, pp formaları*

**stool** [stu:l] *n* 1. taburet; **a piano ~** pianino tabureti; **a bar ~** bar tabureti; 2. *tib.* qarının/mədənin işləməsi; **to go to ~** nəcis ifraz etmək, qarnını boşaltmaq

**stoop¹** [stu:p] *n* 1. bir az beli bükülmə/çiyinləri çıxma; **to walk with a ~** belini əyərək/bükərək yerimək; 2. təzim, baş əymə, təzim etmə; 3. alçaltma, alçalma, hörmətdən salma; həqarət, təhqir; 4. şığıma *(qartal, şahin və s. haq.)*

**stoop²** [stu:p] *v* 1. əymək, bükmək *(belini)*; **to ~ *one's* head** başını əymək; **to ~ *one's* shoulders** çiyinlərini əymək/bükmək; 2. əyilmək, bükülmək; **to ~ in walking** yeriyərkən əyilmək /bükülmək; **to begin to ~ with age** yaşlandıqca beli bükülmək; **to ~ forward** qabağa əyilmək; **to ~ to pick *smth.* up** bir şey götürmək üçün əyilmək; 3. alçalmaq, özünü alçaltmaq; **to ~ to a lie/to begging/to theft** yalan danışmağa/dilənməyə/oğurluğa qədər alçalmaq

**stop¹** [stɔp] *n* 1. dayanma, ləngimə; **short/sudden ~** qısa/qəfil dayanma; **without a ~** dayanmadan; **to make a ~, to come to a ~** dayanmaq; 2. fasilə; **to bring *smb.* to a (dead) ~** bir kəsi susmağa məcbur etmək; 3. son, dayanma; **to bring *smth.* to a ~** bir şeyə son qoymaq; 4. dayanacaq *(avtobus, tramvay və s. üçün)*; *Where is the next stop? Növbəti dayanacaq haradadır?*

**stop²** [stɔp] *v* **(-pp-)** 1. dayandırmaq, əyləmək, saxlamaq; **to ~ a train** qatarı saxlamaq/əyləmək/dayandırmaq; *Stop the car a minute Maşını bir dəqiqə saxla/saxlayın*; 2. dayanmaq; **to ~ to talk** danışmaq üçün dayanmaq; *The rain has stopped Yağış dayanıb; My watch has stopped Mənim saatım dayanıb*; 3. qurtarmaq; **to ~ work/the game** işi/oyunu qurtarmaq; 4. kəsmək; **to ~ water/light** suyu/işığı kəsmək; **to ~ *smb.'s* way** bir kəsin yolunu kəsmək; 5. doldurmaq; **to ~ a gap** yarığı doldurmaq; **to ~ a tooth** dişə plomb qoymaq;

◊ **to ~ a bullet** 1) güllə yarası almaq; 2) öldürülmək *(güllə ilə)*

**stopper¹** [ˈstɔpəʳ] *n* probka, tıxac

**stopper²** [ˈstɔpəʳ] *v* tutmaq, tıxmaq, qapamaq; probka ilə/tıxacla bağlamaq

**storage** [ˈstɔ:rɪdʒ] *n* 1. saxlama, saxlanma; **cold ~** soyuducuda saxlama/saxlanma; 2. anbar, saxlanılan yer; 3. anbarda və ya soyuducuda saxlama haqqı

**storage battery** [ˈstɔ:rɪdʒ.bætərɪ] *n* akkumulyator, akkumulyator batareyası

**storage reservoir** [ˈstɔ:rɪdʒ.rezəvwa:ʳ] *n* su anbarı/hovuzu

**store¹** [stɔ:ʳ] *n* 1. ehtiyat; **a ~ of food** azuqə/ərzaq ehtiyatı; **a ~ of energy** enerji ehtiyatı; **a ~ of money** pul ehtiyatı; **to have a good ~ of *smth.*** bir şeydən yaxşı ehtiyata malik olmaq; **to keep *smth.* in ~** bir şeyi ehtiyatda saxlamaq; 2. anbar; 3. *amer.* mağaza; **clothing ~** hazır paltar mağazası; **a furniture ~** mebel mağazası; **a village ~** kənd mağazası;

◊ **to set no ~ by** əhəmiyyət verməmək, qiymətləndirməmək

**store²** [stɔ:ʳ] *v* 1. təchiz/təmin etmək; doldurmaq; *His mind is stored with knowledge Onun beyni biliklə doludur; O çox şey bilir; Don't store your mind with trivia! Başını/Başınızı boş-boş şeylərlə doldurma/doldurmayın!* 2. ehtiyat yığmaq/görmək, tədarük etmək, saxlamaq; **to ~ (up) food for the winter** qışa azuqə ehtiyatı görmək/tədarük etmək; 3. saxlamağa vermək; **to ~ *one's* furniture** mebelini saxlamağa vermək; 4. toplamaq; *How much energy can this battery store? Bu batareya nə qədər enerji toplaya bilər?*

**storehouse** [ˈstɔ:haus] *n (pl* **-houses** [-hauzɪz]) 1. anbar; 2. xəzinə, dərya; **a ~ of knowledge** elm dəryası

**storekeeper** [ˈstɔ:.ki:pəʳ] *n* anbardar, anbar müdiri

**store-room** [ˈstɔ:ru:m] *n* anbar *(xüs. mağazada)*

**storey** [ˈstɔ:rɪ] *n (pl* **storeys**, *amer.* **stories**) mərtəbə, qat; **on the third ~** dördüncü mərtəbədə/qatda; **the upper/lower ~** yuxarı/aşağı mərtəbə; **to live on the upper/lower ~** yuxarı/aşağı mərtəbədə yaşamaq

**storm¹** [stɔ:m] *n* 1. tufan, boran, fırtına; **a heavy ~** bərk tufan/boran/fırtına; *A storm was raging outside Bayırda tufan/boran azğınlıq edirdi; A storm was coming Tufan/Boran yaxınlaşırdı*; 2. gurultu, səs; **a ~ of protest/of indignation** etiraz/narazılıq gurultusu; **a ~ of weeping** hıçqırıq səsi; 3. güclü həyəcan/çaxnaşma/təşviş; **a political ~** siyasi çaxnaşma; **to stir up a ~** çaxnaşma salmaq, həyəcan/təşviş oyatmaq; 4.

*hərb.* hücum, həmlə; **to take by ~** hücumla/həmlə ilə almaq; **to take a stronghold by ~** qalanı /istehkamı hücumla almaq

**storm²** [stɔ:m] *v* **1.** vıyıldamaq, guruldamaq, coşmaq, şiddət etmək, şiddətlənmək; *The wind stormed outside Bayırda külək vıyıldayırdı*; **2.** qışqırmaq, bağırmaq, çığırmaq; hiddətlənmək, özündən çıxmaq; **to ~ at *smb.*** bir kəsin üstünə qışqırmaq/bağırmaq, bir kəsə hiddətlənmək; **3.** *hərb.* hücumla almaq; **to ~ the town** şəhəri hücumla almaq

**storm bird** ['stɔ:mbə:d] *n zool.* = **stormy petrel**

**storm-cloud** ['stɔ:mklaud] *n* qara bulud

**storm-petrel** ['stɔ:m.petrəl] *n zool.* = **stormy-petrel**

**storm-proof** ['stɔ:mpru:f] *adj* tufanadavamlı

**storm-signal** ['stɔ:m.sɪgnl] *n* tufan/fırtına siqnalı

**storm-troops** ['stɔ:mtru:ps] *n* zorba/hücum qoşunu/dəstəsi

**stormy** ['stɔ:mɪ] *adj* **(-ier, -iest) 1.** boranlı, tufanlı, fırtınalı; **~ weather** boranlı/tufanlı hava; **a ~ night** tufanlı/boranlı gecə; **~ wind** şiddətli külək; *The weather is stormy Hava boranlıdır/tufanlıdır*; **2.** şiddətli, qızğın, gurultulu; **~ discussion** qızğın müzakirə; **~ meeting** gurultulu iclas

**stormy-petrel** ['stɔ:mɪpetrəl] *n zool.* fırtına quşu

**story** ['stɔ:rɪ] *n* **1.** hekayə, povest; **a short ~** qısa hekayə; **a funny ~** gülməli hekayə, lətifə; **2.** fabula, süjet; **3.** hadisə, əhvalat, qəziyyə; nağıl, rəvayət; **4.** yalan, uydurma; **to tell stories** uydurma/yalan danışmaq, uydurmaq

**story-teller** ['stɔ:rɪtelə^r] *n* **1.** hekayə danışan, nağıl edən/söyləyən; **2.** hekayə yazan, hekayələr müəllifi; **3.** *d.d.* yalançı, uydurmaçı

**story-telling** ['stɔ:rɪ.telɪŋ] *n* **1.** hekayə/nağıl danışma; **2.** hekayə/povest yazma; **3.** *d.d.* yalan, uydurma

**stout¹** [staut] *n* I **1.** kök/tosqun adam; **2.** kök adamlar üçün paltar; iri ölçü

**stout** [staut] *n* II tünd-qara pivə

**stout²** [staut] *adj* **(-er, -est) 1.** möhkəm, davamlı; **a ~ piece of string** bir parça möhkəm ip/viş; **a ~ wall** möhkəm divar; **a ~ ship** möhkəm/davamlı gəmi; **2.** igid, qoçaq, cəsarətli, cəsur, cürətli; **a ~ man** igid/qoçaq/cəsur adam; **3.** kök, tosqun; **to become ~** kökəlmək, tosqunlaşmaq; *She's growing rather stout O çox kökəlir/tosqunlaşır*

**stoutish** ['stautɪʃ] *adj* köktəhər, bir az kök/tosqun

**stoutly** ['stautlɪ] *adv* **1.** qətiyyətlə, inadla; **to deny *smth.* ~** bir şeyi qətiyyətlə/inadla inkar etmək; **2.** möhkəm, bərk; **~ built** möhkəm tikilmiş

**stoutness** ['stautnɪs] *n* **1.** möhkəmlik, bərklik, davamlılıq; **2.** şücaət, cəsarət, hünər, qoçaqlıq, igidlik; **3.** köklük, tosqunluq

**stove¹** [stouv] *n* **1.** soba, peç, mətbəx plitəsi; **2.** quruducu kamera

**stove²** [stouv] *v* qurutmaq *(sobada və s.)*

**stove³** [stouv] **to stave** *felinin pt, pp formaları*

**stow** [stou] *v* **1.** qablamaq, qablaşdırmaq, yerləşdirmək; qoymaq; **to ~ clothes in a trunk** paltarları sandığa qablaşdırmaq; **2.** *dan.* lövbəri/yelkəni qaldırmaq; **3.** doldurmaq *(ağzına qədər)*, tıxmaq; **to ~ a trunk with clothes** sandığı paltarla ağzına qədər doldurmaq; **4.** yükləmək; **to ~ cargo** yükü/malı yükləmək *(gəmiyə)*

**stowage** ['stouɪdʒ] *n* **1.** qablama, qablaşdırma, yerləşdirmə; **2.** *dan.* malı gəminin anbarına vurma/yığma; **3.** anbar; **4.** yük

**stowaway** ['stouəweɪ] *n* **1.** biletsiz sərnişin *(xüs. gəmidə)*; **2.** gizlədilmiş şey; **3.** bir şey düzəltmək üçün gizli/xəlvəti yer

**straddle** ['strædl] *v* **1.** ayaqlarını geniş açaraq dayanmaq/oturmaq; **2.** *amer.* tərəddüd etmək, ikimənalı siyasət yeritmək, nə "hə", nə "yox" demək; **3.** ələ keçirmək, tutmaq; **to ~ a river/a railway** *hərb.* çayı/dəmiryolunu ələ keçirmək/tutmaq

**straggle** ['strægl] *v* **1.** geri/geridə/dala qalmaq; qopmaq, aralanmaq; **2.** *hərb.* fərarilik etmək, qaçmaq *(əsgərlikdən)*; **3.** *dən.* kursdan kənara çıxmaq; **4.** dağınıq getmək; **5.** dağınıq olmaq, dağınıq halda yerləşmək/uzanıb getmək; *The town straggles the border between two countries Şəhər iki ölkənin sərhədi arasında dağınıq halda yerləşir*

**straggling** ['stræglɪŋ] *adj* **1.** geridə qalmış; fərarilik etmiş *(əsgər haq.)*; **2.** səpələnmiş, dağınıq, qarmaqarışıq; nizamsız; **a ~ village** səpələnmiş/qarmaqarışıq/nizamsız kənd

**stragglingly** ['stræglɪŋlɪ] *adv* nizamsız, qaydasız; nizamsız/qaydasız halda, səpələnmiş halda/tərzdə

**straight¹** [streɪt] *adj* **1.** düz; **a ~ line/road** düz xətt/yol; **a ~ angle** düz bucaq; **a ~ blow** düz zərbə *(boksda)*; **2.** doğru, düz, qaydada olan; **to put a room ~** otağı qaydaya salmaq; **to put the picture ~ 1)** şəkli düz asmaq; **2)** şəkli düzəltmək; **to put *one's* hair/*one's* tie ~** saçını/qalstukunu qaydaya salmaq; **to put things/ matters ~** işləri qaydaya salmaq; **3.** *d.d.* vicdanlı, namuslu, səmimi; **a ~ man** vicdanlı/ namuslu/səmimi adam; **to be ~ in *one's* dealings** işlərində vicdanlı olmaq; **to keep ~** vicdanlı/səmimi olmaq; **a ~ talk** səmimi söhbət; **4.** *amer. d.d.* bir-bir, tək-tək, dənə-dənə; *Apples are ten cents straight Almaların qiyməti dənə-dənə on sentdir*;

◊ **a ~ face** ifadəsiz sifət/üz; **to keep a ~ face, to keep *one's* face ~** özünü ciddi saxlamaq/göstərmək

**straight²** [streɪt] *adv* **1.** düz, düz xətlə; **to stand ~** düz dayanmaq; **to look *smb.* ~ in the eyes/in the face** bir kəsin gözünə/üzünə düz baxmaq; **to go ~ to London** düz Londona getmək; *The train comes straight from Moscow Bu qatar düz Moskvadan gəlir*; **2.** düz, dəqiq; **to shoot ~** düz/dəqiq atmaq; **3.** açıq, səmimi; **to tell *smb.* ~** bir kəsə açıq/səmimi demək; **~ away** dərhal,



həmən saat, bilatəxir; **to go ~ away** dərhal çıxıb getmək; **to guess ~** dərhal duymaq/ sezmək/ anlamaq; **~ off** əlüstü, o saat; tərəddüd etmədən; **to answer ~ off** əlüstü/o saat cavab vermək

**straighten** ['streɪtn] *v* **1.** düzəltmək *(həm də* **to ~ out)**; **to ~ a piece of wire** bir parça məftili düzəltmək; **to ~ *one's* shoulders** çiyinlərini düzəltmək; **2.** qaydaya salmaq, düzəltmək; **to ~ *one's* tie** qalstukunu düzəltmək; **to ~ (up) a room** otağı qaydaya salmaq; **to ~ (out) *one's* affairs** işlərini qaydaya salmaq; **3.** qaydaya düşmək; *Things will straighten out İşlər qaydasına düşəcək*

**straightforward** [.streɪt'fɔ:wəd] *adj* **1.** düz, birbaşa; **2.** təmiz, doğru, vicdanlı, namuslu, səmimi; **a ~ person** səmimi/təmiz adam; **a ~ answer** səmimi/vicdanlı cavab; **3.** sadə; **a ~ language** sadə dil

**straightforwardly** [.streɪt'fɔ:wədlɪ] *adv* düz, açıq, namusla, səmimiyyətlə; **to act ~** açıq/səmimiyyətlə hərəkət etmək

**straightforwardness** [.streɪt'fɔ:wədnɪs] *n* doğruluq, düzlük, açıqlıq, səmimilik

**straightly** ['streɪtlɪ] *adv* düz, açıq, səmimi, açıqdan-açığa, açıq-açığına

**strain¹** [streɪn] *n* I **1.** dartma, gərmə, dartılma, gərilmə; **to break under the ~** gərilmədən/dartılmadan qırılmaq; *The rope broke under the strain Kəndir dartılmadan qırıldı*; **2.** gərginlik, yük; yorğunluq; **mental ~** əqli/zehni gərginlik; **the ~ of the modern life** müasir/çağdaş həyatın gərginliyi; **to suffer from ~** yorğunluqdan əziyyət çəkmək; **to be on the ~** gərginlikdə olmaq; **to bear/to stand the ~** gərginliyə tab gətirmək/dözmək; **to break under the ~** gərginliyə tab gətirməmək/dözə bilməmək; **to relieve the ~** gərginliyi zəiflətmək/azaltmaq

**strain** [streɪn] *n* II **1.** əsil, mənşə; qəbilə, cins; **of noble ~** kübar əsildən; *This dog is of (a) good strain Bu it yaxşı cinsdəndir*; **2.** irsiyyət; irsilik; irsilik xüsusiyyəti; **a ~ of ferocity** irsi qəddarlıq/ amansızlıq/ rəhmsizlik; **a ~ of insanity in the family** ailədə irsi xəstəlik; **3.** əlamət, çalar, ünsür; **a ~ of ferocity/of weakness** qəddarlıq/zəiflik əlaməti; **4.** üslub, ton *(nitqdə)*; **to speak/to write in a lofty ~** yüksək tonla danışmaq/yazmaq

**strain²** [streɪn] *v* **1.** dartmaq; dartıb gərmək; **to ~ a rope** kəndiri dartmaq; **2.** gücə salmaq; **to ~ *one's* wrist** biləyini gücə salmaq; **3.** yormaq, gərmək; **to ~ oneself** özünü yormaq; **to ~ *one's* eyes** gözlərini yormaq; **4.** yorulmaq; güc vermək/sərf etmək; *The wrestlers strained Pəhləvanlar bütün güclərini topladılar*; **5.** sui-istifadə etmək, artırmaq; **to ~ *one's* authority/*one's* power** öz hakimiyyətindən sui-istifadə etmək; **to ~ *smb.'s* friendship** bir kəsin dostluğundan sui-istifadə etmək; **6.** təhrif etmək; **to ~ the meaning of a word** sözün mənasını təhrif etmək; **to ~ the truth** həqiqəti təhrif etmək; **7.** qucaqlamaq, sıxmaq; **to ~ *smb.* to *one's* bosom** bir kəsi sinəsinə sıxmaq; **8.** süzmək, süzgəcdən keçirmək; **9.** süzülmək, süzgəcdən keçirilmək; *The water strained through the sand Su qumdan süzüldü*

**strained** [streɪnd] *adj* **1.** dartılmış; **a ~ rope** dartılmış kəndir; **2.** gərilmiş, yorğun; **~ nerves** gərilmiş/ yorulmuş əsəblər; **~ relations** gərgin əlaqələr; **3.** qeyri-təbii, süni; **~ laugh/smile** süni gülüş/təbəssüm; **4.** səhv, təhrif edilmiş/olunmuş; **~ interpretation** təhrif edilmiş izahat/şərh/təfsir

**strait** [streɪt] *n* **1.** *coğ.* boğaz; **the Magellan Strait, the Strait of Magellan** Magellan boğazı; **2.** *pl* çətinlik, əziyyət; **to be in serious financial ~s** ciddi maliyyə çətinliyinə düçar olmaq, ciddi maliyyə çətinliyi çəkmək

**straiten** ['streɪtn] *v* məhdudlaşdırmaq, çətinləşdirmək, sıxıntı çəkmək/vermək, sıxışdırmaq; *They were straitened for provisions Onlar ərzaq sıxıntısı/ ərzaqdan sıxıntı çəkirdilər*

**strained** [streɪnd] *adj* **1.** çətin, ağır; **~ times** ağır zamanlar/vaxtlar; **2.** qeyri-təbii, süni; *His manner was strained Onun davranışı qeyri-təbii/süni idi*; **3.** yorğun, əsəbi; **a ~ face at the end of the day** günün sonunda yorğun sifət/üz

**stramonium** [strə'mounɪəm] *n bot.* dəli bəng *(zəhərli bitki)*

**strand¹** [strænd] *n* **1.** saç, tel, zülf; **a ~ of hair** bir dəstə saç/tel/zülf; **2.** sap; **a ~ of beads/of pearls** bir sap muncuq/mirvari

**strand²** [strænd] *v* **1.** eşmək, əyirmək; sarımaq; hörmək, toxumaq; **2.** çətin/çıxılmaz vəziyyətdə qalmaq; *I was strained in a foreign country without a passport Mən xarici/əcnəbi ölkədə pasportsuz çətin vəziyyətdə qalmışdım*

**strange** [streɪndʒ] *adj* **(-r, -st) 1.** tanınmayan, tanış olmayan, naməlum, yad, özgə; **a ~ voice** tanış olmayan/naməlum səs; **a ~ place** naməlum/tanış olmayan/yad yer; **a ~ man** tanış olmayan/yad adam; **a ~ tongue** naməlum/yad dil; **a ~ face** yad/tanış olmayan sifət; *The place is strange to me Bu yer mənə tanış deyil/yaddır*; **2.** qəribə, qeyri-adi; **a ~ man** qəribə adam; **~ behaviour** qəribə/qeyri-adi davranış; **to be ~ in *one's* manner** özünü qəribə/ qeyri-adi aparmaq; **to wear ~ clothes** qəribə/qeyri-adi paltar geymək; *It's a strange thing/story Bu qəribə şeydir/əhvalatdır*; **3.** alışılmamış, adət edilməmiş, məlum /tanış olmayan; *I'm strange to the job Mən bu işlə tanış deyiləm*;

◊ **a ~ woman** *arx.* əxlaqsız qadın

**strangely** ['streɪndʒlɪ] *adv* qəribə, təəccüblü, təəccüblü surətdə, qeyri-adi; *She's been acting very strangely lately Son zamanlar o çox qəribə/qeyri-adi hərəkət edir*

**strangeness** ['streɪndʒnɪs] *n* **1.** qəribəlik, qeyri-

adilik; 2. naməlumluq, tanınmamazlıq; 3. alışmamazlıq, vərdişsizlik

**stranger** ['streɪndʒəʳ] *n* 1. yad/tanış olmayan adam, naməlum şəxs/adam; **a perfect/utter/total ~** tamamilə yad adam; **to be ~ to *smb.*** bir kəsə tanış olmamaq/yad olmaq; *He's a perfect stranger to me O mənə tamamilə yaddır; The dog barks at strangers İt yad adamlara hürür;* 2. yadelli, gəlmə; *I'm stranger here Burada mən yadelliyəm/gəlməyəm;* 3. kənar adam, ailə üzvü olmayan, qonaq; **to make a ~ from *smb.*** bir kəsə qonaq kimi münasibət göstərmək

**strangle** ['stræŋgl] *v* 1. boğmaq; **to ~ *smb.*** bir kəsi boğmaq; *The man strangled her with her own scarf Kişi onu öz şərfi ilə boğdu; This tight colar is strangling me Bu dar yaxalıq məni boğur;* 2. boğulmaq, təngnəfəs olmaq; 3. yatırtmaq, boğmaq, susdurmaq; **to ~ insurrection** qiyamı/buntu beşikdə yatırtmaq; **to ~ evil at its birth** şəri rüşeymdə boğmaq

**strap¹** [stræp] *n* 1. qayış, kəmər, toqqa; 2. parça/dəmir və s. zolağı; 3. bağlama, düyünləmə; 4. *harb.* poqon; 5. şallaq/qamçı/toqqa cəzası

**strap²** [stræp] *v* 1. bağlamaq, sarımaq; kəməri/toqqanı bərkitmək; **to ~ a parcel** bağlamanı sarımaq/ bağlamaq; 2. kəmərlə/şallaqla döymək; 3. gərgin işləmək; 4. təmizləmək *(atı)*

**strapping** ['stræpɪŋ] *adj* ucaboy, boylu-buxunlu, yekəpər; güclü, qüvvətli, qüvvəli; **a ~ fellow** sağlam/ boylu-buxunlu oğlan; *They have four strapping children Onların dörd boylu-buxunlu uşağı var*

**strategic** [strə'ti:dʒɪk] *adj* strateji; **~ decisions/planning** strateji qərarlar/planlaşdırma; **~ atomics** strateji atom silahı; **~ bombing** strateji bombalama; **~ (raw) materials** strateji xammal

**strategical** [strə'ti:dʒɪkəl] *adj* = **strategic**

**strategically** [strə'ti:dʒɪkəlɪ] *adv* strateji baxımdan; **~ important target** strateji baxımdan vacib hədəf

**strategics** [strə'ti:dʒɪks] *n* strategiya

**strategist** ['strætɪdʒɪst] *n* strateq *(mahir sərkərdə/komandan)*; **a military ~** hərbi strateq

**strategy** ['strætədʒɪ] *n* 1. strategiya; **military ~** hərbi strategiya; **defensive ~** müdafiə strategiyası; 2. plan *(müəyyən bir məqsədə çatmaq üçün)*; **to work out a ~ to gain promotion** irəliləmək üçün plan hazırlamaq

**stratosphere** ['strætəsfɪəʳ] *n* stratosfer *(atmosferin dəniz səthindən 8-12 km yüksəklikdə olan üst təbəqəsi)*

**stratum** ['stra:təm] *n* *(pl* **strata** [-tə]) 1. *geol.* təbəqə, qat, lay; 2. təbəqə *(cəmiyyətdə)*; **the various strata of society** cəmiyyətin müxtəlif təbəqələri; **the lower social strata** cəmiyyətin aşağı təbəqələri

**straw¹** [strɔ:] *n* 1. kövşən; küləş; 2. kövşən şlyapa

**straw²** [strɔ:] *adj* kövşən, küləş; **a ~ hat** kövşən şlyapa; **a ~ mat** kövşən döşək

**strawberry¹** ['strɔ:bərɪ] *n bot.* bağ çiyələyi

**strawberry²** ['strɔ:bərɪ] *adj* çiyələk; **~ jam** çiyələk mürəbbəsi/cemi; **~ leaves** çiyələk yarpaqları

**stray¹** [streɪ] *n* 1. sürüdən dala qalmış və ya azmış heyvan; 2. evsiz-eşiksiz tək adam, sahibsiz uşaq; sahibsiz pişik və ya it; 3. *məc.* həqiqi yolunu azmış adam

**stray²** [streɪ] *adj* 1. azmış; evsiz; sahibsiz; sürüdən ayrı düşmüş; **a ~ child** sahibsiz uşaq; **a ~ cat/dog** sahibsiz pişik/it; **a ~ sheep** sürüdən dala qalmış qoyun; 2. təsadüfi; nadir; naqafil; **a ~ bullet** təsadüfi/naqafil güllə; **~ acquaintance** təsadüfi tanışlıq; 3. dartılmamış *(ip, sap və s.)*

**stray³** [streɪ] *v* 1. azmaq, yoldan çıxmaq; ayrı düşmək; **to ~ from the road** yoldan çıxmaq, azmaq, yolu itirmək; *The sheep has strayed from the flock Qoyun sürüdən ayrılıb/ayrı düşüb;* 2. *məc.* kənara çıxmaq; **to ~ from the point** mövzudan kənara çıxmaq; 3. *məc.* yolundan sapmaq, yolunu azmaq, pis yola düşmək

**streak¹** [stri:k] *n* 1. zolaq; damar; nazik qat; **a black ~** qara zolaq/damar və s.; **~s of red** qırmızı damarlar; **a ~ of light** işıq zolağı; 2. *d.d.* dövr, müddət, vaxt; **a ~ of good luck** xoşbəxt dövr/vaxt; 3. xüsusiyyət *(xarakterdə)*; **a nervous ~** əsəbilik; hay-küyçülüyə meyllilik; **a yellow ~** xainliyə/xəyanətə/namərdliyə meyllilik

**streak²** [stri:k] *v* 1. zolaq çəkmək; ləkə-ləkə etmək; 2. *d.d.* cəld/çevik hərəkət etmək; sürətlə/çaparaq getmək, qaçmaq; 3. parlayıb/yanıb sönmək, sayrışmaq; 4. diqqəti cəlb etmək üçün ictimai yerdə çılpaq qaçmaq

**streakness** ['stri:knɪs] *n* 1. zolaqlılıq; 2. *d.d.* dəyişkənlik, dönüklük, vəfasızlıq; 3. *d.d.* tündməcazlıq, tez hirslənmə, əsəbilik

**streaky** ['stri:kɪ] *adj* 1. zolaqlı; 2. piy qatı olan *(ət və s. haq.)*; 3. dəyişkən, səbatsız, qərarsız; 4. *d.d.* tündməcaz, tez hirslənən, tez acıqlanan, əsəbi

**stream¹** [stri:m] *n* 1. balaca çay; 2. axın; sel *(həm də məc)*; **a ~ of tears/of blood/of words** göz yaşlarının / qan/söz seli; **a ~ of light** işıq seli; 3. qatar, cərgə, sıra; axın; **a ~ of people** insan axını; **a ~ of cars** maşın qatarı;
◊ *Little streams make great rivers at. söz. ≅ Dama-dama göl olar*

**stream²** [stri:m] *v* 1. axmaq; sel kimi axmaq/axıb getmək; batmaq, bulanmaq; **to ~ with blood** qana bulanmaq; **to ~ with perspiration** qan-tərə batmaq; *Her eyes were streaming with tears Onun gözlərindən sel kimi yaş axırdı; He was streaming with perspiration Ondan tər sel kimi axırdı;* 2. parlamaq, işıq/nur saçmaq; *The light streams out of the window İşıq pəncərədə parlayır/nur saçır;* 3. tökülmək, axışıb gəlmək; *People streamed in from all quarters İnsanlar/Adamlar hər tərəfdən axışıb gəldilər;* 4. yelləmək; **to ~ a handkerchief/a flag** dəsmalı/bayrağı yelləmək; 5. yellənmək; *The flag streamed in the wind Bayraq küləkdən yellənirdi;* 6. tez/çevik hərəkət etmək, sürətlə ötüb/keçib getmək



**street** [stri:t] *n* küçə; **the main ~ of the town** şəhərin baş/əsas küçəsi; **manners of the ~** küçə davranışları; **in the ~/*amer.* on the ~** küçədə; **to live in this/in that ~** bu küçədə/o küçədə yaşamaq; **to meet *smb.* in the ~** bir kəsə küçədə rast gəlmək; **to walk the ~s/in the ~s** küçələri/küçələrdə gəzmək;
◊ **to walk the ~s, to be on the ~s** fahişəliklə/qəhbəliklə məşğul olmaq; **to be in the same ~ with *smb.*** bir kəslə eyni vəziyyətdə olmaq

**streetcar** ['stri:tka:ʳ] *n* = **tram**

**street-sweeper** ['stri:t.swi:pəʳ] *n* 1. küçəsüpürən maşın; 2. küçə süpürən *(adam)*

**streetwalker** ['stri:twɔ:kəʳ] *n* 1. küçədə gəzən adam; 2. fahişə, qəhbə

**strength** [streŋθ] *n* 1. güc, qüvvə, qüvvət; **~ of body** fiziki güc /qüvvə; **~ of mind** mənəvi güc/qüvvə; **~ of words** sözün gücü/qüvvəsi; **a person of great ~** çox qüvvətli/güclü adam; **to possess great ~** böyük gücə/qüvvəyə malik olmaq; **the ~ of the wind** küləyin gücü; **to recover/to regain ~** gücü bərpa etmək; 2. *tex.* möhkəmlik, davamlılıq; müqavimət; **the ~ of a rope/of a chain** kəndirin/zəncirin davamlılığı/möhkəmliyi; **~ of materials** matierialların müqaviməti; 3. bərklik *(torpaqda)*; 4. *fiz.* gərginlik *(qütblərdə)*; 5. əlçatmazlıq, alınmazlıq, möhkəmlik; 6. sabitlik; davamlılıq *(qiymətdə)*; 7. miqdar, say; say tərkibi; **NATO military ~** NATO-nun hərbi gücünün miqdarı; **~ at sea** hərbi dəniz donanmasının miqdarı

**strengthen** ['streŋθən] *v* 1. gücləndirmək, qüvvətləndirmək; **to ~ ties of friendship** dostluq tellərini/əlaqələrini gücləndirmək; 2. möhkəmlətmək; **to ~ a wall** hasarı möhkəmlətmək; 3. güclənmək, qüvvətlənmək; *The wind has strengthened Külək gücləndi*

**strengthening** ['streŋθənɪŋ] *n* möhkəmlətmə, gücləndirmə, qüvvətləndirmə; **the ~ of friendly ties** dostluq əlaqələrini/tellərini möhkəmlətmə

**strenuous** ['strenjuəs] *adj* 1. güc/qüvvə/gərginlik/səy tələb edən; **~ work** gərgin/çətin iş; 2. gərgin; **~ life** gərgin həyat

**strenuously** ['strenjuəslɪ] *adv* gərgin, səylə; **to work ~** gərgin/səylə işləmək

**stress¹** [stres] *n* 1. təzyiq, basqı, təzyiq etmə, qısqı gəlmə; **under the ~ of poverty** kasıblıq təzyiqi altında; **under the ~ of fear** qorxu təzyiqi/qısqısı altında; 2. *dilç.* vurğu; **primary/ secondary/ emphatic/rhetorical ~** əsas/ikinci dərəcəli/ emfatik/ retorik vurğu; **to put a ~** vurğu qoymaq; *Put the stress on the first syllable Vurğunu birinci hecaya/birinci hecanın üstünə qoy/qoyun*

**stress²** [stres] *v* 1. vurğu qoymaq; 2. *məc.* vurğulamaq, xüsusi olaraq nəzərə çatdırmaq /çarpdırmaq/ qeyd etmək, altından xətt çəkmək; *He stressed the importance of treating customers politely O, müştərilərlə nəzakətlə davranmağın əhəmiyyətini vurğuladı/xüsusi olaraq qeyd etdi/nəzərə çatdırdı*

**stretch¹** [stretʃ] *n* 1. sərələnmə, tirlənmə; çəkib uzatma; **to give a ~** gərnəşmək; **to give *smth.* a ~** bir şeyi çəkib/dartıb uzatmaq; 2. gərginlik, gərilmə, gərginləşmə; **on the ~** gərginlik altında; 3. yer, sahə; **level ~** düz/hamar yer; 4. müddət, vaxt; **a ~ of three months** üç aylıq müddət; **for a long ~ of time** uzun müddətə/vaxta; 5. şişirtmə, artırma; **a ~ of power/of authority** hakimiyyəti artırma; 6. gəzinti, seyr, ayaqseyri; 7. dartıb/çəkib uzatma; **~ a pair of gloves** əlcəyi dartıb uzatma; 8. gərnəşmə; **to have a ~** gərnəşmək; *He got out of bed, had a good stretch and began to get dressed O, yataqdan durdu, yaxşı-yaxşı gərnəşdi və geyinməyə başladı*

**stretch²** [stretʃ] *v* 1. dartmaq, dartıb/çəkib uzatmaq; çəkmək, uzatmaq, gərmək; **to ~ a bow** yay kirişini dartmaq; **to ~ gloves** əlcəyi dartıb uzatmaq; *Don't stretch the material, you'll rip it Parçanı dartma/ dartmayın, onu cırarsan/cırarsınız;* **to ~ one's neck** boğazını uzatmaq; 2. sərələnmək, sərilmək, tirlənmək; 3. gərnəşmək; *He woke up, yawned and stretched O, yuxudan durdu, əsnədi və gərnəşdi;* 4. çəkmək; **to ~ a rope across the room** otaq boyu ip/kəndir çəkmək; 5. uzanmaq; uzanıb getmək; *This forest stretches for miles Bu meşə millərlə uzanıb gedir;* 6. *d.d.* şişirtmək, artırmaq; uzatmaq; **to ~ a story** əhvalatı şişirtmək/uzatmaq; **to ~ a privilege** imtiyazdan sui-istifadə etmək; 7. tələsmək, yollanmaq, yola düşmək; **to ~ out** uzatmaq; **to ~ out one's hand** əlini uzatmaq

**stretcher** ['stretʃəʳ] *n* 1. xərək; 2. çərçivə *(şəkil çəkmək üçün üzərinə kətan çəkilən)*

**stretcher-bearer** ['stretʃəbeərəʳ] *n* xərək daşıyan sanitar

**strew** [stru:] *v* *(pt* **strewed**; *pp* **strewed** *və ya* **strewn** [stru:n]) 1. *(xüs. məchulda işlənir)* atmaq, dağıtmaq; səpmək, səpələmək; **to ~ papers upon the table** kağızları stolun üstünə atmaq; **to ~ sand over the road** yola qum səpələmək/səpmək; *They strewed flowers in his path Onlar onun yoluna çiçək səpələdilər;* 2. **(with)** tökmək, örtmək; **to ~ the floor with sand** döşəməyə qum tökmək, döşəməni qumla örtmək

**stricken** ['strɪkən] *adj* 1. zədələnmiş, pozulmuş; **~ with disease** xəstəlikdən zədələnmiş; 2. yaralı; xəstə; **~ beast** yaralanmış/xəstə vəhşi heyvan

**strict** [strɪkt] *adj* (-er, -est) 1. dəqiq; **~ rules** dəqiq qaydalar; **~ instructions** dəqiq göstərişlər/təlimatlar; **the ~ sense of the word** sözün dəqiq mənası; 2. ciddi; tələbkar; **a ~ teacher** ciddi tələbkar müəllim; **to be ~ with *smb.*** bir kəsə qarşı ciddi/tələbkar olmaq

**strictly** ['strɪktlɪ] *adv* dəqiq, ciddi, ciddi/qəti su-

rətdə; **to define *one's* terms** ~ öz şərtlərini dəqiq/qəti surətdə müəyyənləşdirmək

**strictness** ['strıktnıs] *n* dəqiqlik, dürüstlük; ciddilik, qətilik, tələbkarlıq, sərtlik

**stride**[1] [straıd] *n* 1. iri addım; **to walk with long ~s** yolla iri addımlarla yerimək/gəzmək; **to shorten/to lengthen the ~** addımı qısaltmaq/böyütmək; 2. yerə qoyulmuş ayaqların arasındakı məsafə;
◊ **to get into *one's* ~** işə girişmək

**stride**[2] [straıd] *v* (*pt* **strode** [stroud]; *pp* **stridden** ['strıdn]) 1. iri addımlarla getmək, addımlamaq; **to ~ along the road** yolla iri addımlarla getmək; **to ~ up to *smb.*** iri addımlarla bir kəsə yaxınlaşmaq; 2. adlayıb keçmək, üstündən keçmək; adlamaq; **to ~ over a river/a ditch** çayın /qanovun üstündən adlayıb keçmək

**stridency** ['straıdnsı] *n* 1. cırıldama, cırıltı səsi; xışıltı; 2. kəskinlik, sərtlik

**strident** [straıdnt] *adj* 1. cırıldayan, xışıldayan; 2. kəskin; sərt, qaba; **a~ voice** kəskin/sərt səs

**strife** [straıf] *n* 1. çəkişmə, mübarizə; mübahisə; dalaşma, qovğa, vuruşma, didişmə; razı olmama, razılaşmama; narazılıq, nifaq; **policy of ~** çəkişmə siyasəti; **to be at ~** mübarizə aparmaq; **to make ~** nifaq/narazılıq salmaq; **to cease from ~** silahı yerə qoymaq; 2. yarış, yarışma

**strike**[1] [straık] *n* I 1. zərbə; **to make a ~ at *smb.*** 1) bir kəsə əl qaldırmaq; bir kəsə zərbə endirmək; 2) dişləmək, sancmaq, vurmaq (*zəhərli həşərat, ilan haq.*); 2. yataq tapma/aşkar etmə (*neft, kömür və s. yataqları*); 3. gözlənilməz uğur (*həm də* **lucky ~**)

**strike** [straık] *n* II tətil; **to be on ~** tətil etmək; **to go on ~** tətili elan etmək; **sympathetic ~** həmrəylik tətili; **a miners' ~** şaxtaçıların tətili; **general ~** ümumi tətil; **unofficial ~** qeyri-rəsmi tətil

**strike**[2] [straık] *v* I (*pt, pp* **struck** [strʌk]) 1. vurmaq; zərbə endirmək, döymək; **to ~ (on/upon) the table** stolun üstünə vurmaq; **to ~ *smb.*** bir kəsi vurmaq/döymək; **to ~ *smb.* in the face** bir kəsin üzünə vurmaq; **to ~ a blow** zərbə endirmək; *Who struck the first blow? Birinci zərbəni kim endirdi? He struck the nail with a hammer O, mismarı çəkiclə vurdu*; **to ~ a blow aside** zərbəni dəf etmək; 2. dəymək, toxunmaq; **to ~ *smth.*** bir şeyə dəymək/ toxunmaq; **to ~ a mine/a rock** minaya/qayaya toxunmaq; *She struck her elbow against the door Onun dirsəyi qapıya dəydi/toxundu; The bullet struck the tree Güllə ağaca dəydi*; 3. hücum etmək; *The enemy struck at dawn Düşmən dan yeri ağaranda/ şəfəq söküləndə hücum etdi*; 4. heyrətləndirmək, heyrətə salmaq, heyran/valeh etmək, mat qoymaq; sarsıtmaq; **to ~ *smb.* dead** bir kəsi bərk sarsıtmaq; 5. tapmaq; təsadüfən rast gəlmək (*həm də* **to ~ on/upon**); **to ~ gold** qızıl yatağı tapmaq; **to ~ water** su tapmaq; **to ~ oil** neft yatağı tapmaq; 6. istiqamət almaq, dönmək; **to ~ into the woods** meşəyə tərəf istiqamət almaq/dönmək; *Strike to the right Sağa dön /dönün*; 7. keçmək; **to ~ through clouds** buludları yarıb keçmək; *The sun rays struck through the clouds Günəş şüaları buludları yarıb keçdi; The wind struck through the cracks Külək yarıqlardan keçirdi*; 8. çatmaq, yetişmək; **to ~ the village** kəndə çatmaq/ yetişmək; *The sound struck (upon) her ear Səs onun qulağına çatdı*; 9. pozmaq, çıxartmaq; məhv/yox/ləğv etmək; **to ~ a communication from the record** məlumatı protokoldan çıxartmaq; *They have struck out some pages Onlar bir neçə səhifə çıxarıblar; We demanded that this book be struck off the list Biz tələb etdik ki, bu kitab siyahıdan çıxarılsın*; 10. təəccübləndirmək, heyran/valeh etmək; təsəvvür yaratmaq; diqqəti cəlb etmək; *It struck me that he was not telling the truth Məni təəccübləndirən o idi ki, o, həqiqəti danışmadı; He always strikes people that way O həmişə adamlarda belə təsəvvür yaradır*; 11. başına/ağlına gəlmək; *A thought has struck me Başıma bir fikir gəlib*; 12. yandırmaq; **to ~ a match** spiçka/kibrit yandırmaq; 13. vurmaq (*saat haq.*); *The clock has just struck four Saat indicə dördü vurub; Listen, the clock is striking Qulaq as/asın saat vurur*; 14. vurmaq, döyünmək (*ürək haq.*); *His heart is striking heavily Onun ürəyi bərk döyünür*; 15. kəsmək, zərb etmək (*sikkə və s.*); 16. tərtib etmək (*siyahı və s.*); **to ~ a committee** komissiya tərtib etmək; **to ~ at *smb.*** bir kəsin üstünə atılmaq, bir kəsə hücum etmək; **to ~ at *smb.* with a sword** qılıncla bir kəsin üstünə atılmaq; **to ~ into *smth.*** bir şeyi başlamaq; **to ~ a song** mahnı oxumağa başlamaq; **to ~ back** cavab zərbəsi endirmək; **to ~ off** kəsmək, çapmaq (*qılıncla, balta ilə*); **to ~ off *smb.'s* head** bir kəsin başını kəsmək; **to ~ through** pozmaq; **to ~ a word through** sözü pozmaq; **to ~ up** başlamaq; **to ~ up a quarrel** savaş/söyüşmə başlamaq

**strike** [straık] *v* II (*pt, pp* **struck** [strʌk]) 1. tətil etmək; **to ~ against long hours** uzun iş günü əleyhinə tətil etmək; **to ~ for higher pay** əmək haqqının artırılması uğrunda tətil etmək

**strike-breaker** ['straık.breıkə^r] *n* ştreykbrexer, xain, satqın (*tətil vaxtı işləyərək xəyanət edən adam*)

**strike-breaking** ['straık.breıkıŋ] *n* tətili yatırma

**striker** ['straıkə^r] *n* 1. tətilçi, tətildə iştirak edən fəhlə; 2. hücumçu (*futbolda*)

**striking** ['straıkıŋ] *adj* 1. heyranedici, valehedici; fövqəladə; **a ~ young woman** heyranedici gənc qadın; 2. diqqətəşayan, diqqətəlayiq, parlaq, diqqəti cəlb edən; **a ~ example** diqqətəlayiq /parlaq misal; **~ colours** diqqəti cəlb edən rənglər/boyalar



**strikingly** ['straıkıŋlı] *adv* olduqca, təəccüblü, qəribə; **a ~ handsome man** olduqca gözəl kişi

**string**[1] [strıŋ] *n* 1. kəndir; **a ball of ~** bir yumruq/kələf kəndir; **to tie up a parcel with a ~** bağlamanı kəndirlə bağlamaq; 2. *mus.* sim; **to touch the ~s** simlərə toxunmaq, simli aləti çalmaq; 3. qatar, sıra, cərgə; **a ~ of houses** evlərin qatarı/sırası/cərgəsi; **a long ~ of tourists** turistlərin uzun cərgəsi/qatarı; *I had a string of questions to ask him Mənim ondan soruşulası bir sıra sualım vardı*; 4. sap; ip; **a ~ of pearls** bir sap mirvari; **a ~ of onions** bir ip soğan

**string**[2] [strıŋ] *v* (*pt, pp* **strung** [strʌŋ]) 1. sim salmaq (*musiqi alətinə*); 2. çəkmək (*simi və s.*); 3. köklənmək (*musiqi alətini*); 4. bağlamaq; qaytanlamaq, qaytan salmaq, qaytanla bağlamaq; 5. cərgəyə/sıraya düzmək; 6. cərgəyə/sıraya durmaq; **to ~ along** sadiq/sədaqətli olmaq (*bir kəsə*); **to ~ up** gərginləşdirmək, həyəcanlandırmaq

**stringed** ['strıŋd] *adj* 1. simli; **~ instrument** simli alət; 2. kəndirlə bağlanmış

**stringency** ['strındʒənsı] *n* 1. ciddilik, ciddiyyət, tələbkarlıq, zabitəlilik; sərt qayda; 2. inandırıcılıq, əsaslılıq, sübutluluq, tutarlılıq; 3. pul çatışmazlığı

**stringent** ['strındʒənt] *adj* 1. ciddi, zabitəli, tələbkar; sərt; məcburi; **~ rule** ciddi qayda; **~ control** ciddi nəzarət; **to make a rule less ~** qaydanı yumşaltmaq; 2. pul defisiti/kəsiri hiss edən; 3. inandırıcı, tutarlı, əsaslı

**stringently** ['strındʒəntlı] *adv* 1. ciddi, ciddi şəkildə/surətdə, qəti, qəti surətdə; *The regulations must be stringently observed Təlimata ciddi surətdə əməl edilməlidir*; 2. inandırıcı/qaneedici surətdə, sübutlu, əsaslı

**stringless** ['strıŋlıs] *adj* 1. simsiz; 2. bağsız, bəndsiz

**strip**[1] [strıp] *n* 1. uzun, nazik parça, zolaq; lent; **a ~ of board/of wood** planka, tamaşa (*ensiz uzun taxta*); 2. yumor səhifəsi (*qəzetdə, jurnalda*)

**strip**[2] [strıp] *v* (-pp-) I uzun ensiz hissələrə bölmək, zolaq-zolaq kəsmək

**strip** [strıp] *v* (-pp-) II 1. soyundurmaq; **to ~ *smb.* of clothes** bir kəsin paltarını soyundurmaq; **to ~ *smb.* to the skin** bir kəsi lüt/başdan ayağa soyundurmaq; 2. soyunmaq; **to ~ of *one's* clothing** paltarını soyunmaq; *She stripped off and ran into the water O soyundu və suya cumdu*; 3. qopartmaq, soymaq, sıyırmaq; təmizləmək; *Elephants strip the leaves off/from trees Fillər ağacların yarpaqlarını sıyırırlar*; 4. qarət etmək, soymaq, talamaq, çalıb-çapmaq; *The bandits stripped the house Banditlər evi qarət etdilər/taladılar/soydular*; 5. sökmək; **to ~ a weapon** silahı sökmək

**stripe** [straıp] *n* 1. zolaq; yelən; **black cloth with red ~s** qırmızı zolaqlı qara parça; **a table-cloth with a wide green ~** enli yaşıl yelənli stol örtüyü; 2. tikmə; nişan; şevron (*hərbi qulluqçuların paltarına tikilən bafta nişan*); 3. zolaqlı parça; **to wear the ~s** dustaq paltarı geymək, dustaq olmaq; 4. *amer.* növ, qəlib; **a man of that ~** o qəbildən olan adam; 5. *d.d.* pələng

**striped** [straıpt] *adj* zolaqlı, zolaq-zolaq; **a ~ shirt/tie/suit** zolaqlı köynək/qalstuk/kostyum

**stripling** ['strıplıŋ] *n* cavan/gənc oğlan, yeniyetmə

**stripy** ['straıpı] *adj* zolaqlı, zolaq-zolaq; **a ~ blouse** zolaqlı qofta; **~ trousers** zolaq-zolaq şalvar

**strive** [straıv] *v* (*pt* **strove** [strouv] *və ya* **strived**; *pp* **striven** ['strıvn]) 1. çalışmaq, can atmaq, əlləşmək (*uzun müddət*); **to ~ to win** qalib gəlməyə çalışmaq; **to ~ for victory** qələbəyə çalışmaq/can atmaq; 2. (**with, against**) mübarizə aparmaq; **to ~ against oppression** əsarətə/zülmə qarşı mübarizə aparmaq

**striven** ['strıvn] **to strive** *felinin pp forması*

**stroke**[1] [strouk] *n* 1. zərbə; **mortal ~** ölümcül zərbə; **the ~ of a hammer** çəkicin zərbəsi; **a ~ of lightning** ildırımın zərbəsi; **at the first ~** birinci zərbədə; **at one ~, at a ~** bir zərbədə; **to aim a ~ at *smb.*** zərbəni bir kəsə yönəltmək; 2. *tib.* tutma, özündən getmə; iflic; *He has had a stroke O, iflic olub*; 3. yol, üsul; **clever ~** ağıllı üsul/yol; **a ~ of policy** siyasi yol/üsul; 4. saatın vurması; **on the ~ of twelve** on ikini vuranda (*saat*); 5. vurma (*ürək haq.*)

**stroke**[2] [strouk] *v* 1. sığallamaq, oxşamaq (*əllə*); **to ~ a cat** pişiyi sığallamaq/tumarlamaq; **to ~ *one's* beard** saqqalını sığallamaq; **to ~ a child** uşağı oxşamaq; 2. toxunmaq (*topa*), vurmaq (*topu*); *He stroked the ball easily O, topu yüngülcə vurdu, O, topa yüngülcə toxundu*; 3. takt vermək (*avarçəkənlərə*);
◊ **to ~ *smb.* down** bir kəsi sakitləşdirmək; **to ~ *smb.'s* hair the wrong way, to ~ *smb.* against the hair** bir kəsi əsəbiləşdirmək/qıcıqlandırmaq

**stroll**[1] [stroul] *n* gəzinti, seyr, ayaqseyri; **to take/to go for a ~** gəzintiyə çıxmaq

**stroll**[2] [stroul] *v* gəzmək, gəzib dolaşmaq, ayaqseyrinə çıxmaq; **to ~ along the beach** çimərlik boyu gəzmək; **to ~ the streets** küçələrdə gəzib dolaşmaq

**stroller** ['stroulə^r] *n* 1. avara, səfil, sərsəri; 2. gəzərgi aktyor

**strolling** ['strouIıŋ] *adj* gəzən, gəzərgi; daim yerini dəyişən; **a ~ actor/musician** gəzərgi aktyor/musiqiçi

**strong** [strɔŋ] *adj* (**-er, -est**) **1.** güclü, qüvvəli, qüvvətli; **a ~ man** güclü/qüvvəli/qüvvətli adam; **~ poison** güclü zəhər; **a ~ horse** güclü/qüvvətli at; **as ~ as a horse** at kimi güclü/qüvvəli; **to be ~ in chemistry/in physics** *etc.* kimyadan/fizikadan güclü olmaq; **2.** möhkəm, sağlam; **~ stomach** sağlam mədə; **~ nerves** möhkəm əsəblər; **to be quite ~** tamam sağlam olmaq; *He's quite strong again O yenidən tamam sağlamdır*; **3.** bərk, sarsılmaz, davamlı; **a ~ stick** bərk ağac; **a ~ fortress** sarsılmaz qala; **~ soil** bərk torpaq; **4.** qüdrətli; **a ~ king** qüdrətli kral; **to be ~ at sea** dənizdə qüdrətli olmaq; **5.** kəskin, tünd; **~ smell** kəskin iy/qoxu; **~ cheese** tünd/kəskin pendir;
◊ **the ~ sex** güclü cins, kişi cinsi; **the ~ arm of the law** qanunun gücü

**strong-armed** [ˈstrɔŋˈa:md] *adj amer. d.d.* güclü, qüvvətli, gücü/qüvvəsi olan

**strongbox** [ˈstrɔŋbɔks] *n* seyf *(yanmayan şkaf)*

**stronghold** [ˈstrɔŋhould] *n* **1.** qala, bürc, istehkam; istinadgah; dayaq; **a ~ of republicanism** respublikaçılığın dayağı/istinadgahı; **~ of peace** sülhün dayağı; **2.** *harb.* dayaq nöqtəsi

**strongly** [ˈstrɔŋlı] *adv* bərk, güclü, möhkəm, zərbə ilə

**strongroom** [ˈstrɔŋru:m] *n* möhkəm/etibarlı otaq *(şey saxlamaq üçün)*

**strove** [strouv] **to strive** *felinin pt forması*

**struck** [strʌk] **to strike** *felinin pt, pp formaları*

**structural** [ˈstrʌktʃərəl] *adj* **1.** struktur, quruluş; **~ linguistics** struktur dilçilik; **~ analysis** struktur təhlil; **2.** tikinti; **a ~ engineer** tikinti mühəndisi; **~ material** tikinti materialı

**structurally** [ˈstrʌktʃərəlı] *adv* quruluşca, quruluş baxımından; *This building is structurally sound Bu bina quruluş baxımından möhkəmdir*

**structure** [ˈstrʌktʃəʳ] *n* **1.** quruluş; **the ~ of the human body** insan bədəninin quruluşu; **the ~ of the atom** atomun quruluşu; **the ~ of the society** cəmiyyətin quruluşu; **the ~ of a language** dilin quruluşu; **2.** bina, tikili; **a stately ~** əzəmətli /möhtəşəm tikili

**structureless** [ˈstrʌktʃəlıs] *adj* quruluşsuz, quruluşu olmayan; amorf; *Water is structureless Suyun quruluşu yoxdur, Su amorfdur*

**struggle**[1] [ˈstrʌgl] *n* mübarizə, mücadilə; **the class ~** sinfi mübarizə/mücadilə; **the ~ for the championship** çempionluq uğrunda mübarizə/mücadilə; **the ~ against tyranny** müstəbidliyə/istibdada qarşı mübarizə/mücadilə; **the ~ for existence** yaşamaq uğrunda mübarizə; **~ to the last** son nəfəsinə qədər mübarizə; **to give in without a ~** mübarizəsiz/mücadiləsiz təslim olmaq

**struggle**[2] [ˈstrʌgl] *v* **1.** mübarizə/mücadilə aparmaq; mübarizə etmək, vuruşmaq; **to ~ for peace/for liberty** sülh uğrunda/azadlıq uğrunda mübarizə aparmaq; **to ~ for existence** yaşamaq uğrunda mübarizə aparmaq; **to ~ to the last breath** son nəfəsinə qədər mübarizə aparmaq/mücadilə etmək; **2.** çapalamaq, çarpışmaq; çalışmaq, əlləşmək, çalışıb-çapalamaq; **to ~ in** *smb.***'s arms** bir kəsin qolları arasında çapalamaq *(xilas olmaq üçün)*; **3.** çalışmaq; səy etmək/göstərmək; **to ~ with a problem** problem üzərində əlləşmək/çalışmaq; **to ~ along** çətinliklə/zorla hərəkət etmək; **to ~ on** yaşamaq uğrunda mübarizəni davam etdirmək

**strum**[1] [strʌm] *n* danqıldatma, dınqıldatma *(musiqi alətini)*

**strum**[2] [strʌm] *v* dınqıldatmaq, danqıldatmaq; **to ~ (on) a guitar** gitaranı dınqıldatmaq; **to ~ (on) a piano** pianonu dınqıldatmaq

**strung** [strʌŋ] **to string** *felinin pp forması*

**strut**[1] [strʌt] *n* vüqarlı/iddialı/lovğa yeriş

**strut**[2] [strʌt] *v* vüqarla/iddialı/lovğa yerimək

**stub**[1] [stʌb] *n* kötük; **the ~ of a pencil** karandaşın kötüyü; **the ~ of a cigar/of a cigarette** siqarın/siqaretin kötüyü *(qalığı)*; **the ~ of a tooth** dişin kötüyü

**stub**[2] [stʌb] *v* (**-bb-**) **1.** qopartmaq, kökündən çıxarmaq *(həm də* **to ~ up***)*; **to ~ (up) weeds** alağı/alaq otlarını kökündən çıxarmaq; **2.** təmizləmək; kötükdən təmizləmək; **to ~ (out) a field** sahəni təmizləmək, sahədə olan kötükləri çıxartmaq; **3.** ayaqları ilə bir şeyə bərk toxunmaq; **4.** papiros kötüyünü söndürmək *(əzərək, tapdalayaraq)*

**stubble** [ˈstʌbl] *n* **1.** kövşənlik, biçilmiş tarla/yer; kövşən; **2.** qısa qırxılmış saç; **3.** çoxdan qırxılmış saqqal; cod tük

**stubbly** [ˈstʌblı] *adj* **1.** kövşənli, kövşənlə örtülmüş; biçilməmiş; **2.** cod, sərt *(tük haq.)*

**stubborn** [ˈstʌbən] *adj* **1.** tərs, inad, inadcıl, kəc, inadkar adam; **a ~ man** tərs/inadcıl/kəc adam; **as ~ as a mule/as a donkey** qatır/uzunqulaq kimi tərs; **2.** sürəkli, gərgin; **~ battle** gərgin döyüş/vuruş; **3.** çətin, güccatmaz, müalicə olunmaz; **~ illness** müalicə olunmaz xəstəlik;
◊ *Facts are stubborn things ≅ Faktları heç bir şey dəyişə bilməz*

**stubbornly** [ˈstʌbənlı] *adj* **1.** tərsliklə, tərs-tərs; **2.** inadla; **to struggle ~** inadla mübarizə aparmaq

**stubbornness** [ˈstʌbənnıs] *n* tərslik, inad, inadcıllıq, inadkarlıq, kəclik

**stubby** [ˈstʌbı] *adj* **1.** kötüyəbənzər, kötüyəoxşar, kötük kimi; **~ fingers** kötük kimi barmaqlar; **2.** cod qıllı *(saqqal haq.)*

**stuck**[1] [stʌk] **to stick** *felinin pt, pp formaları*

**stuck**[2] [stʌk] *v* **1.** yapışmaq; *I can't open the window. It's stuck Mən pəncərəni aça bilmirəm. O yapışıb*; **2.** batıb/ilişib qalmaq, ilişmək; *The boat is stuck in the mud Qayıq palçığa batıb/ilişib qalıb*

**stuck-up** [ˈstʌkˈʌp] *adj d.d.* lovğa, iddialı, təkəbbürlü

**stud** [stʌd] *n* **1.** at zavodu; **2.** cinslik/damazlıq/döllük ferması

**student** [ˈstju:dnt] *n* **1.** tələbə; **a medical ~** tibb universitetinin/institutunun/kollecinin tələbəsi; **a ~ of law** hüquq fakültəsinin tələbəsi; **2.** öyrənən *(bir şeyi)*; **a ~ of nature/of law** təbiəti/qanunları öyrənən *(adam)*

**studentship** [ˈstju:dntʃıp] *n* **1.** tələbəlik, tələbəlik illəri; **2.** təqaüd

**studied** [ˈstʌdıd] *adj* **1.** qabaqcadan, düşünülmüş, qəsdən/ qərəzlə/bilə-bilə edilmiş, qəsdən edilən/ edilmiş; **~ insult** qəsdən edilmiş təhqir; **2.** süni, saxta, yalançı; qeyri-təbii; **~ politeness** süni/saxta lütfkarlıq

**studio** [ˈstju:dıou] *n (pl* **-os** [-ouz]) **1.** studiya; **2.** radiostudiya; radio studiyası; **3.** kinostudiya, kino studiyası; **4.** telestudiya, televiziya studiyası

**studious** [ˈstju:dıəs] *adj* **1.** çalışqan, səyli; **a ~ pupil** çalışqan/səyli şagird; **2.** elmlə məşğul olan, elmi sevən, özünü elmə həsr edən; **a person of ~ habits** elmi sevən/özünü elmə həsr edən adam

**studiously** [ˈstju:dıəslı] *adv* səylə, cidd-cəhdlə, ciddiyyətlə, çalışqanlıqla, qətiyyətlə; *He studiously ignored us O qətiyyətlə bizə etinasızlıq göstərdi/məhəl qoymadı*

**studiousness** [ˈstju:dıəsnıs] *n* canfəşanlıq, səy, cəhd, cidd-cəhd, çalışqanlıq

**study**[1] [ˈstʌdı] *n* **1.** öyrənmə, tədqiqat; tədqiq etmə, tədqiqat aparma; **the ~ of physics/of human nature** fizikanı/insan təbiətini öyrənmə; **to be fond of ~** elmi tədqiqatı çox sevmək, elmi tədqiqatla həvəslə məşğul olmaq; **to give** ***one's*** **time to ~** vaxtını elmi fəaliyyətə həsr etmək; **to make a ~ of** ***smth.*** bir şeyi diqqətlə öyrənmək; *Scientific studies have shown that smoking causes cancer Elmi tədqiqat göstərib ki, papiros çəkmək xərçəng törədir;* **2.** *adət. pl* bilik əldə etmə/qazanma; dərs, məşğələ; təhsil; **to begin** ***one's*** **studies** təhsilə başlamaq; **to return to** ***one's*** **studies after an illness** xəstəlikdən sonra dərsə/oxumağa qayıtmaq; **to continue/to finish** ***one's*** **studies** təhsilini davam etdirmək/qurtarmaq; **3.** elm, elm sahəsi; **human studies** humanitar elmlər; **4.** elmi iş, monoqrafiya; **5.** iş otağı, kabinet

**study**[2] [ˈstʌdı] *v* **1.** öyrənmək; tədqiq etmək, tədqiqat aparmaq; gözdən keçirmək; götür-qoy etmək; **to ~ the situation** vəziyyəti öyrənmək/götür-qoy etmək; *I'll study your proposal Mən sənin/sizin təklifini/təklifinizi götür-qoy edərəm/öyrənərəm*; **to ~ history/languages** tarixi/dilləri öyrənmək; **2.** oxumaq, məşğul olmaq; **to ~ hard** çox/səylə oxumaq; **3.** (**for**) hazırlaşmaq *(bir şeyə)*; **to ~ for an examination** imtahana hazırlaşmaq; **to ~ to be a doctor** həkim olmağa hazırlaşmaq; **4.** *d.d.* razı salmaq, qane etmək; *I have a friend to study Mən dostumu razı salmalıyam*; **to ~ out 1)** müəyyən etmək, aydınlaşdırmaq, müəyyənləşdirmək; **2)** həll etmək; **to ~ up** imtahana hazırlaşmaq

**stuff**[1] [stʌf] *n* **1.** material; maddə, cisim; mal; **raw ~** xammal; xam maddə; **carpenter's ~** meşə materialı, taxta-şalban; **2.** şey; *This wine is good stuff Bu şərab yaxşı şeydir; Put your stuff in the bag Şeylərini/ Şeylərinizi çantana/çantanıza qoy/qoyun*; **3.** *d.d.* dərman *(həm də* **doctor's ~***)*; **to take too much doctor's ~** çoxlu dərman qəbul etmək; **4.** parça *(xüs. yun)*; **5.** zir-zibil, tullantı, cır-cındır; dəyərsiz şeylər; *Do you call this stuff wine? Sən/Siz bu zir-zibili/zəhrimarı şərab adlandırırsan? /adlandırırsınız?*; **6.** (**the ~**) *d.d.* pul, para; *Has she got the stuff? Onun pulu/parası varmı?*
◊ **good ~, the ~** viski

**stuff**[2] [stʌf] *v* **1.** doldurmaq; içini doldurmaq; **to ~ a sack with straw** kisəni samanla doldurmaq; **to ~ a pillow with feathers** balışı tüklə doldurmaq; **to ~ fish/chicken** balığın/çolpanın içini doldurmaq; **2.** yemləmək, yedirmək, bordaqlamaq, kökəltmək; **to ~ goose** qazı bordaqlamaq *(kəsmək üçün)*; **to ~ a child with food** uşağı zorla yedirtmək; **3.** tıxamaq, dürtmək, təpmək, soxmaq; **to ~** ***one's*** **things into a suit-case** şeylərini çamadana tıxamaq/ təpmək/ dürtmək; **to ~** ***one's*** **hands into** ***one's*** **pocket** əllərini cibləri‑nə soxmaq/dürtmək

**stuffiness** [ˈstʌfınıs] *n* bürkü, boğanaq, ağırlıq *(hava haq.)*

**stuffy** [ˈstʌfı] *adj* (**-ier, -iest**) **1.** boğanaq, bürkü, bürkülü; ağır *(hava haq.)*; **a ~ room** bürkülü otaq; *It's a bit stuffy today Bu gün bir az bürküdür*; **2.** maraqsız, yorucu; **~ debate** maraqsız debat/ müzakirə

**stumble**[1] [ˈstʌmbl] *n* **1.** büdrəmə, ayağı dolaşma; **2.** duruxma, tutulma *(danışarkən)*; **3.** səhv, səhv addım

**stumble**[2] [ˈstʌmbl] *v* **1.** büdrəmək, ayağı dolaşmaq; **~ and fall** büdrəyib yıxılmaq; **to ~ in the dark** qaranlıqda büdrəmək; **2.** dili dolaşmaq /topuq çalmaq, duruxa-duruxa danışmaq; *She stumbled over the unfamiliar word but then continued O, tanış olmadığı sözdə duruxdu, lakin sonra davam etdi*;
◊ **to ~ at/on the threshhold** lap əvvəldən/ başlanğıcdan çətinliklə üzləşmək

**stump**[1] [stʌmp] *n* **1.** kötük; qalıq; papiros kötüyü; **the ~ of a pencil/tooth** karandaşın/dişin kötüyü; **2.** ağacdan qayrılmış ayaq; **3.** gödəkboy, bəstəboy *(adam)*

**stump**[2] [stʌmp] *v* **1.** *d.d.* çıxılmaz/çətin vəziyyətə salmaq, çaşdırmaq; **to ~ *smb.*** bir kəsi çaşdırmaq /çətin vəziyyətə salmaq; **2.** axsamaq, axsaya-axsaya yerimək, ayaqlarını sürüyə-sürüyə /ağır-ağır yerimək; **3.** kəsmək, doğramaq *(ağacı)*; **to ~ up** kökündən çıxartmaq/qopartmaq

**stumpy** ['stʌmpɪ] *adj* kök və gödək, gödək, pota; **~ legs** kök və gödək qıçlar; **~ fingers** kök və gödək barmaqlar; **a ~ tail** gödək quyruq; **a ~ man** pota adam

**stun** [stʌn] *v* **(-nn-) 1.** qulaq batırmaq, kar etmək; *The roar stunned us Nərilti qulağımızı batırdı/bizi kar etdi*; **2.** vurub gicəllətmək/sarsıtmaq; **to ~ *smb.* with a blow** bir kəsi zərbə ilə vurub gicəlləndirmək/ sarsıtmaq; *The news stunned us Xəbər bizi sarsıtdı*

**stung** [stʌŋ] **to sting** *felinin pp forması*

**stunner** ['stʌnəʳ] *adj d.d.* qəşəng, gözəl; *This hat is stunner Bu şlyapa qəşəngdir/gözəldir*

**stunning** ['stʌnɪŋ] *adj* qulaqbatırıcı; sarsıdıcı; **~ blow** sarsıdıcı zərbə

**stunningly** ['stʌnɪŋlɪ] *adv* çox gözəl/yaxşı

**stunt**[1] [stʌnt] *n* böyümənin ləngiməsi *(insanlarda, bitkilərdə)*

**stunt**[2] [stʌnt] *v* inkişafın/böyümənin qarşısını almaq *(insanlarda, bitkilərdə və s.)*; *The war stunted his artistic development Müharibə onun rəssam kimi inkişafına mane oldu*

**stupefaction** [ˌstju:pɪ'fækʃn] *n* **1.** donma, quruma, donub/quruyub qalma; mat qalma *(təəccübdən, qorxudan)*; **2.** son dərəcə təəccüblənmə

**stupefy** ['stju:pɪfaɪ] *v (pt, pp* **-fied) 1.** heyrətləndirmək, heyrətə salmaq, təəccübləndirmək, valeh etmək; sarsıtmaq; *I was stupefied by the news Xəbər məni heyrətə saldı/sarsıtdı*; **2.** keyləşdirmək *(ağılı, hissi)*; **to be stupefied with grief** dərddən/kədərdən keyləşmək; **3.** *tib.* bihuş etmək

**stupendous** [ˌstju:'pendəs] *adj* **1.** nəhəng, çox böyük/ iri; **a ~ mistake/explosion** çox böyük səhv/ partlayış; **2.** çox gözəl/yaxşı; **a ~ view** çox gözəl mənzərə/ görünüş; *The opera was stupendous! Opera çox gözəl idi*

**stupid** ['stju:pɪd] *adj* **(-er, -est) 1.** axmaq, key, qanmaz, anlamaz, fərasətsiz, sarsaq; **a ~ man** axmaq/ qanmaz/key adam; **to give a ~ answer** axmaq cavab vermək; **2.** maraqsız, cansıxıcı, yorucu; **a ~ letter** maraqsız məktub; **a ~ town** cansıxıcı şəhər; **3.** keyləşmiş; **to get/to grow ~** keyləşmək

**stupidity** [stju:'pɪdɪtɪ] *n* axmaqlıq, giclik, sarsaqlıq; *The accident was due to my own stupidity Hadisə mənim öz axmaqlığımdan baş verdi*

**stupidly** ['stju:pɪdlɪ] *adj* axmaq-axmaq, gic-gic, sarsaq-sarsaq; axmaqcasına, sarsaqcasına; *He grinned stupidly O gic-gic dişlərini ağartdı*

**sturdily** ['stə:dɪlɪ] *adv* möhkəm, davamlı; **a ~ built house** möhkəm tikilmiş ev

**sturdy** ['stə:dɪ] *adj* **(-ier, -iest) 1.** möhkəm, davamlı; **a ~ chair/frame** möhkəm stul/çərçivə; **~ footwear** davamlı/möhkəm ayaqqabı; **2.** sağlam; **a ~ child** sağlam uşaq

**sturgeon** ['stə:dʒən] *n zool.* nərə balığı

**stutter**[1] ['stʌtəʳ] *n* kəkələmə, pəltəkləmə; pəltəklik; **to speak with a slight ~** bir az pəltək danışmaq/ pəltəkləmək; *He has a terrible stutter O, dəhşətli şəkildə /çox pis kəkələyir*

**stutter**[2] ['stʌtəʳ] *v* **1.** kəkələmək, pəltəkləmək, pəltək danışmaq; **2.** duruxmaq, hıqqanmaq, dili dolaşmaq, duruxa-duruxa danışmaq

**stutterer** ['stʌtərəʳ] *n* kəkə, pəltək *(adam)*

**sty**[1] [staɪ] *n* I **1.** donuz damı; **2.** it damı, pəyə, daxma

**sty** [staɪ] *n* II *(pl* **sties** *və ya* **styes)** *tib.* itdirsəyi

**sty**[2] [staɪ] *v* **1.** donuz/it damında saxlamaq; donuz/it damına salmaq; **2.** çirk/çirkab içində yaşamaq

**style**[1] [staɪl] *n* **1.** üslub; ifadə üsulu; **personal ~** şəxsi üslub; **the ~ of a writer** yazıçının üslubu; **the modern ~ of building** müasir inşaat üslubu; **humorous/turgid/lofty ~** yumoristik/təmtəraqlı /yüksək üslub; **written in a delightful ~** çox gözəl üslubda yazılmış; **the ~ of Sabir** Sabirin üslubu; **2.** üsul, tərz, qayda; **different ~s of swimming** üzmənin müxtəlif üsulları; *I don't like his style of talking Mən onun danışıq tərzini xoşlamıram*; **3.** zövq; **a woman of ~** zövqlü qadın; **to dress in good ~** yaxşı zövqlə geyinmək; **4.** dəb, mod; **in the latest ~** ən son dəbdə/modda

**style**[2] [staɪl] *v* **1.** *amer.* dəbə salmaq; dəblə tikmək; **2.** müasirləşdirmək, yeniləşdirmək; **3.** oymaq, naxış açmaq, həkk etmək; **4.** ad/ləqəb vermək, adlandırmaq; *The country styles itself "People's Democratic Republic" Ölkə özünü "Xalq Demokratik Respublikası" adlandırır*

**stylish** ['staɪlɪʃ] *adj* modalı, modaya uyğun; dəbdə olan; **~ clothes** dəbdə olan paltar; **~ furniture** dəbdə olan mebel

**stylishly** ['staɪlɪʃlɪ] *adv* dəblə, modaya uyğun, gözəl, qəşəng

**stylishness** ['staɪlɪʃnɪs] *n* zəriflik, incəlik, gözəllik

**stylistic** [staɪ'lɪstɪk] *adj* stilistik, üslub; **~ features** üslub xüsusiyyətləri; **~ elements** üslub ünsürləri

**stylistically** [staɪ'lɪstɪkəlɪ] *adv* üslubca, üslub baxımından/ nöqteyi-nəzərindən

**stylistics** [staɪ'lɪstɪks] *n* stilistika, üslubiyyət *(üslub haq. nəzəriyyə)*

**stymie**[1] ['staɪmɪ] *n* çıxılmaz/çətin vəziyyət

**stymie**[2] ['staɪmɪ] *v* çıxılmaz vəziyyətə salmaq, divara dirəmək

**subclass**[1] ['sʌbkla:s] *n* yarımsinif



**subclass**[2] ['sʌbkla:s] *v* yarımsiniflərə bölmək

**subcommittee** ['sʌbkəˌmɪtɪ] *n* yardımçı komissiya /komitə

**subconcious** [sʌb'kɔnʃəs] *adj* instinktiv

**subconciously** [sʌb'kɔnʃəslɪ] *adv* instinktiv olaraq

**subdivide** [ˌsʌbdɪ'vaɪd] *v* **1.** hissələrə ayırmaq/ bölmək; **2.** hissələrə bölünmək/ayrılmaq

**subdivision** ['sʌbdɪˌvɪʒn] *n* **1.** hissələrə bölmə/ ayırma; **2.** şöbə, bölmə, yarımqrup

**subdue** [səb'dju:] *v* **1.** zəbt/fəth/istila etmək, tabe etmək; **to ~ completely** tamamilə tabe etmək; **to ~ nature** təbiəti tabe etmək; **2.** yatırtmaq, boğmaq; **to ~ a revolt** qiyamı yatırtmaq; **to ~ *one's* passion** ehtirasını boğmaq; **3.** zəiflətmək, yumşaltmaq, azaltmaq; **to ~ temperature** hərarəti/qızdırmanı azaltmaq; **4.** becərmək; **to ~ rough land** daşlı-kəsəkli torpağı becərmək

**subdued** [səb'dju:d] *adj* **1.** sakit; dilxor, mütəəssir; *You're very subdued. What's wrong? Sən/Siz çox dilxorsan/dilxorsunuz. Nə olub?*; **2.** yumşaldılmış, boğuq *(səs haq.)*; **~ conversation** pıçıltı ilə aparılan söhbət

**sub-editor** ['sʌb'edɪtəʳ] *n* redaktor köməkçisi, şöbə redaktoru

**subheading** ['sʌbhedɪŋ] *n* yarımsərlövhə

**subject**[1] ['sʌbdʒɪkt] *n* **1.** mövzu; **historical ~** tarixi mövzu; **serious/ difficult/interesting/dull ~** ciddi/ çətin/maraqlı/ maraqsız mövzu; **a ~ for discussion** müzakirə mövzusu; **to change the ~** mövzunu dəyişmək; **to return to *one's* ~** mövzusuna qayıtmaq; **to choose a ~ for a dissertation** dissertasiya üçün mövzu seçmək; **2.** süjet; **tragic(al) ~** tragik süjet; **the ~ of a play** pyesin süjeti; **3.** fənn; **compulsory/optional ~s** icbari/fakultativ fənlər; **4.** əsas, bəhanə, səbəb; **a ~ for congratulation** təbrik üçün bəhanə/səbəb; **5.** vətəndaş, təbəə; **British ~** Britaniya vətəndaşı/təbəəsi; **6.** *dilç.* mübtəda; **the logical/the grammatical ~** məntiqi/qrammatik mübtəda; **the ~ of the sentence** cümlənin mübtədası

**subject**[2] ['sʌbdʒekt] *adj* **1.** tabe, asılı; **a ~ nation** asılı dövlət; **to be held ~** asılı olmaq; **to be ~ to the laws of nature** təbiətin qanunlarına tabe olmaq; **2. (to)** meylli; **to be ~ to colds** soyuqlamağa meylli olmaq

**subject**[3] [səb'dʒekt] *v* **1.** tabe etmək; **to ~ a nation to *smb.'s* rule** ölkəni bir kəsin hakimiyyətinə tabe etmək; **2.** etmək; məruz qoymaq; **to ~ *smb.* to an operation** bir kəsi operasiya etmək, bir kəsin üzərində cərrahiyyə əməliyyatı aparmaq; **3.** təqdim etmək; **to ~ *one's* plan to *smb.'s* consideration** planını baxmaq üçün bir kəsə təqdim etmək/bir kəsin mülahizəsinə vermək/təqdim etmək

**subjection** [səb'dʒekʃn] *n* **1.** fəth/zəbt/istila etmə, zorla alma; özünə tabe etmə; **to bring into ~** tabe/fəth etmək; **2.** asılılıq, tabelilik; **to keep/to hold *smb.* in ~** bir kəsi asılılıqda/tabelikdə saxlamaq

**subjective** [səb'dʒektɪv] *adj* **1.** subyektiv; şəxsi; **judgement ~** subyektiv mühakimə; **~ impression** şəxsi təəssürat; **2.** *dilç.* subyekt; **~ case** subyekt halı, adlıq hal

**subjectively** [səb'dʒektɪvlɪ] *adv* subyektiv tərzdə/ olaraq, şəxsi baxımdan

**subjectiveness** [səb'dʒektɪvnɪs] *n* subyektivlik

**subjectivism** [səb'dʒektɪvɪzm] *n fəls.* subyektivizm *(obyektiv varlığı, maddi aləmi inkar edən və onun ancaq subyektin şüurunda mövcud olduğunu iddia edən idealist fəlsəfi cərəyan)*

**subjectivist** [səb'dʒektɪvɪst] *n* subyektivist *(subyektivizm tərəfdarı)*

**subjugate** ['sʌbdʒugeɪt] *v* fəth/zəbt etmək; əsarət altına almaq, kölə halına salmaq, tabe etmək

**subjugation** [səbdʒu'geɪʃn] *n* fəth/istila/zəbt /tabe etmə; **~ of territory** ərazini istila/zəbt/fəth etmə

**subjugator** [ˌsʌbdʒu'geɪtəʳ] *n* fateh, istilaçı

**sub-librarian** [ˌsʌblaɪ'breərɪən] *n* kitabxanaçının köməkçisi

**submarine**[1] [ˌsʌbmə'ri:n] *n* sualtı qayıq

**submarine**[2] [ˌsʌbmə'ri:n] *adj* sualtı; **a ~ volcano/ cable/ boat** sualtı vulkan/kabel/qayıq; **~ plants** sualtı bitkilər

**submariner** [sʌb'mærɪnəʳ] *n* sualtı qayığın heyət üzvü

**submission** [səb'mɪʃn] *n* **1.** tabe olma, itaət etmə; **compulsory/unconditional ~** məcburi/şərtsiz tabe olma; **to refuse ~** itaət etməkdən/tabe olmaqdan imtina etmək; **2.** itaətkarlıq, boyun əymə; əməl etmə, qulaq asma, itaət; **mute/complete ~** danışıqsız/tam itaət; **3.** təqdim etmə, vermə *(sənədlərini)*; **the ~ of a passport for inspection** yoxlamaq üçün pasportu təqdim etmə

**submissive** [səb'mɪsɪv] *adj* itaətli, itaətkar, müti, boyun əyən, sözə qulaq asan; **a ~ son** itaətli/itaətkar/sözə qulaq asan oğul

**submissively** [səb'mɪsɪvlɪ] *adv* itaətlə, itaətkarcasına, acizanə, itaətkarlıqla, fağır-fağır, yazıq-yazıq

**submit** [səb'mɪt] *v* **(-tt-) 1.** tabe olmaq, itaət etmək; boyun əymək; **to ~ entirely/mutely** tam /danışıqsız tabe olmaq; **to ~ to terms** şərtlərə tabe olmaq, şərtləri qəbul etmək; **to ~ to defeat** məğlubiyyətlə barışmaq; **2.** etmək, düçar etmək; **to ~ *smb.* to examination** bir kəsi imtahan etmək; **3.** baxılmağa təqdim etmək *(məhkəməyə, komissiyaya və s.)*; **to ~ a case to the court** işi baxılmaq üçün məhkəməyə təqdim etmək

**subordinacy** [sə'bɔ:dɪnəsɪ] *n* tabelilik, asılılıq

**subordinate¹** [sə'bɔ:dınıt] *adj* 1. asılı, asılı olan, tabe, tabe olan; **a ~ position** asılı/tabe vəziyyət; **to be in a ~ situation** tabe/asılı vəziyyətdə olmaq; 2. ikinci dərəcəli; **a ~ part** ikinci dərəcəli rol; *He plays a subordinate part O, ikinci dərəcəli rol oynayır*; 3. *dilç.* tabeli; **~ clause** tabeli cümlə

**subordinate²** [sə'bɔ:dıneıt] *v* tabe/asılı etmək; **to ~ passions to reason** ehtirasları ağla tabe etmək; **to ~ *one's* own interests to the public interests** öz şəxsi maraqlarını ictimai maraqlara tabe etmək

**subordinating** [sə'bɔ:dıneıtıŋ] *adj dilç.* tabelik, tabelik bildirən/ifadə edən; **~ conjunctions** tabelik bildirən bağlayıcılar

**subordination** [sə,bɔ:dı'neıʃn] *n* 1. tabelilik, asılılıq; 2. subordinasiya *(xidmətdə kiçiyin böyüyə tabe olması prinsipi)*

**subordinative** [sə'bɔ:dınətıv] *adj dilç.* = **subordinating**

**subscribe** [səb'skraıb] *v* 1. maddi yardım vermək; pul buraxmaq; 2. yazılmaq *(abunə)*; **to ~ to a newspaper** qəzetə yazılmaq, qəzetə abunəçi olmaq; 3. yazmaq *(abunəçi)*; **to ~ *smb.* to a newspaper/to a magazine** bir kəsi qəzetə/jurnala yazmaq/abunəçi etmək; 4. razılaşmaq, qoşulmaq; **to ~ to an opinion** rəylə/ fikirlə razılaşmaq; **to ~ to a proposal** təklifə qoşulmaq; 5. qol çəkmək, imzalamaq, imza atmaq; **to ~ *one's* name to a document** sənədə qol çəkmək/imza atmaq

**subscriber** [səb'skraıbə^r] *n* 1. ianəçi, ianə verən; 2. abunəçi; **a ~ to a new publication** yeni nəşrə abunəçi; 3. abunəçi *(telefona)*; **a telephone ~** telefon abunəçisi/sahibi

**subscription¹** [səb'skrıpʃn] *n* 1. ianə, ianə vermə; bağışlama; 2. abunə ödənişi/haqqı; 3. abunəçi; **a ~ to a newspaper/to a magazine** qəzetə/ jurnala abunəçi; 4. üzvlük haqqı; **a ~ to a club** kluba üzvlük haqqı; **to pay *one's* ~** üzvlük haqqını ödəmək/vermək; 5. təsdiq etmə *(imza atmaqla)*; 6. qol çəkmək, imzalamaq, imza atmaq *(sənədə və s.)*

**subscription²** [səb'skrıpʃn] *adj* abunə, ianə; **a ~ book** abunə kitabı, abunə ilə alınan kitab; **~ edition/ publication** abunə nəşri; **a ~ form** abunə/yazılmaq üçün forma; **a ~ fee** abunə haqqı/ödənişi

**subsection** ['sʌb,sekʃn] *n* 1. yarımbölmə, yarımşöbə; 2. yarımfəsil, fəslin bir hissəsi; 3. paraqraf, maddə, bənd

**subsequent** ['sʌbsıkwənt] *adj* sonrakı, ardınca/ sonradan gələn, daha sonrakı; **~ events** sonrakı hadisələr; **the ~ ratification of the treaty** müqavilənin sonrakı təsdiqi/ratifikasiyası

**subsequently** ['sʌbsıkwəntlı] *adv* nəticədə, sonra; *They subsequently heard he had left the country Sonra onlar eşitdilər ki, o, ölkəni tərk edib*

**subservience** [səb'sə:vıəns] *n* yaltaqlıq, alçalma

**subservient** [səb'sə:vıənt] *adj* 1. yaltaq, qulluq göstərən, quyruq bulayan; 2. əhəmiyyətli, faydalı; 3. tabe edilmiş, tabe, asılı

**subside** [səb'saıd] *v* 1. aşağı enmək/düşmək, azalmaq; *The floods have subsided Daşqın azalıb; The fever subsided Qızdırma aşağı düşdü/azaldı*; 2. sakitləşmək, yavaşımaq, kəsilmək; *The storm subsided Tufan sakitləşdi; The noise subsided Səs kəsildi*

**subsidence** [səb'saıdəns] *n* 1. azalma, düşmə; 2. sakitləşmə, kəsilmə; 3. çökmə *(torpaq haq.)*

**subsidiary** [səb'sıdıərı] *adj* köməkçi, yardımçı; ikinci dərəcəli; **~ body** köməkçi/yardımçı təşkilat *(BMT-də və s.)*

**subsidium** [səb'sıdıjəm] *n* = **subsidy**

**subsidy** ['sʌbsədı] *n* maddi yardım, pul köməyi, maliyyə yardımı

**subsist** [səb'sıst] *v* 1. mövcud olmaq, yaşamaq; *Superstition still subsists there Orada hələ də xurafat mövcuddur*; 2. qidalanmaq, yaşamaq; **to ~ on vegetables** tərəvəzlə qidalanmaq; **to ~ by begging** dilənməklə yaşamaq

**subsistence** [səb'sıstəns] *n* 1. mövcud olma, yaşama; ömür; **to prolong ~** ömrü uzatmaq; 2. həyat üçün vasitələr, yeyəcək, ruzi; **reduced ~** azaldılmış yeyəcək; **means of ~** yaşayış vasitələri; **minimum of ~** həyat/yaşamaq üçün minimum şeylər; **to drive *one's* ~ from fishing** ruzisini balıq tutmaqla qazanmaq, balıq ovu ilə yaşamaq

**subsistent** [səb'sıstənt] *adj* mövcud olan; yaşayan

**subsoil** [,sʌb'sɔıl] *n* torpağın alt qatı, torpaqaltı qat

**substance** ['sʌbstəns] *n* 1. maddə; **a poisonous/ chemical ~** zəhərli/kimyəvi maddə; 2. mahiyyət, əsil məna/məzmun; **the ~ of the case** işin mahiyyəti/əsas mənası; **to come to the ~ of the matter** məsələnin mahiyyətinə varmaq/gəlmək; **in ~** mahiyyətcə; *I agree with you in substance Mahiyyətcə, mən səninlə/sizinlə razıyam*; 3. *fəls.* substansiya, materiya; 4. möhkəmlik, sıxlıq; 5. var, var-dövlət, mal; **a man of ~** varlı/dövlətli adam; **to waste *one's* ~** var-dövlətini dağıtmaq/puç etmək

**substantial** [səb'stænʃl] *adj* 1. möhkəm, bərk, davamlı; əsaslı; **a ~ house** möhkəm ev; **~ furniture** möhkəm/ davamlı mebel; **a man of ~ build** möhkəm bədənli adam; 2. qidalı, doyumlu *(yemək haq.)*; **~ food** qidalı/doyumlu ərzaq; **~ meal** doyumlu xörək/yemək; 3. vacib, böyük, əsas; **~ argument** vacib/əsas dəlil; 4. dövlətli, varlı, varlı-hallı; **a ~ farmer** dövlətli/varlı-hallı fermer; 5. real, maddi

**substantially** [səb'stænʃəlı] *adv* 1. mahiyyətcə, əsasən; *I substantially agree with you Mən mahiyyətcə/ əsasən səninlə/sizinlə razıyam*; 2. möhkəm; əsaslı; **to dine ~** möhkəm/doyunca nahar etmək; 3. xeyli/ əhəmiyyətli dərəcədə; *Their performance has substantially improved Onların tamaşaları əhəmiyyətli dərəcədə yaxşılaşıb*



**substantiate** [səb'stænʃıeıt] *v* 1. həqiqiliyini sübut etmək *(bir şeyin)*, kifayət qədər sübut gətirmək; **to ~ a claim** tələbin həqiqiliyini sübut etmək; **to ~ a charge** ittihamı sübutlarla möhkəmlətmək; 2. reallaşdırmaq; 3. möhkəmlətmək, davamlı etmək

**substantiation** [səb,stænʃı'eıʃn] *n* sübut etmə /edilmə, dəlillərlə sübuta yetirmə; sübut, dəlil

**substantive¹** [səbs'tæntıv] *n dilç.* isim, ad

**substantive²** [səbs'tæntıv] *adj* əsaslı, ciddi, həqiqi; real; **~ changes** əsaslı/ciddi dəyişikliklər

**substation** ['sʌb'steıʃn] *n pl* yarımstansiya, köməkçi stansiya

**substitute¹** ['sʌbstıtju:t] *n* 1. müavin, əvəz; **to be appointed *smb.'s* ~** bir kəsin müavini təyin edilmək; 2. *id.* əvəz edən oyunçu; 3. dəyişmə; dəyişdirmə, əvəz etmə/edilmə; **temporary /efficient ~** müvəqqəti /təsirli əvəz etmə/əvəz; **to find a ~** əvəz tapmaq

**substitute²** ['sʌbstıtju:t] *v* 1. əvəz etmək; **to ~ for *smb.*** bir kəsi əvəz etmək; *Can you substitute me at the meeting? Sən/Siz məni iclasda əvəz edə bilərsənmi? /bilərsinizmi?*; 2. dəyişmək; **to ~ one word/one term/one document for another** bir sözü/ termini/ sənədi başqası ilə dəyişmək; 3. *id.* dəyişmək *(bir oyunçunu başqası ilə)*

**substitution** [,sʌbstı'tju:ʃn] *n* 1. dəyişmə, dəyişdirilmə, əvəz, əvəz etmə/edilmə; 2. *id.* dəyişmə, əvəz, dəyişiklik; *Two substitutions were made during the football match Futbol yarışı müddətində iki dəyişiklik edildi*

**substratum** ['sʌbstra:təm] *n (pl -ta)* 1. alt qat; **~ of society** cəmiyyətin alt qatları; 2. əsas, özül; 3. *k.t.* torpağın alt qatı

**substructure** ['sʌbstrʌktʃə^r] *n* 1. *tik.* əsas, özül, təməl, bünövrə; 2. alt tikili/quruluş *(yol haq.)*

**subtitle** ['sʌbtaıtl] *n* 1. yarımsərlövhə; 2. subtitr *(kinofilm kadrlarının altında verilən yazı)*

**subtle** ['sʌtl] *adj (-r, -st)* 1. incə, zərif; **a ~ style/ distinction** incə üslub/fərq; **~ irony** incə yumor; **~ perfume** zərif ətir; 2. ağıllı, fərasətli, açıqgözlü, kəskin; **a ~ strategy/policy** ağıllı strategiya/siyasət; **~ mind** kəskin ağıl; 3. sirli; **~ power/magic** sirli qüvvə/möcüzə; 4. bacarıqlı, mahir, qabil, məharətli; **~ fingers** bacarıqlı/məharətli barmaqlar; 5. bic, hiyləgər; **~ enemy** hiyləgər/bic düşmən

**subtlety** ['sʌtltı] *n* 1. zəriflik, incəlik; 2. kəskinlik; ağıllılıq, fərasət, açıqgözlülük, gözüaçıqlıq, fərasətlilik; 3. dəqiqlik, dürüstlük; 4. incə/zərif fərq; 5. biclik, hiyləgərlik, riyakarlıq

**subtly** ['sʌtlı] *adv* 1. incə, zərif; 2. bicliklə, hiyləgərliklə; 3. ağılla, fərasətlə

**subtropical** [,sʌb'trɔpıkl] *adj* subtropik; **~ plants** subtropik bitkilər; **a ~ climate** subtropik iqlim/ab-hava

**suburb** ['sʌbə:b] *n* şəhərətrafı qəsəbə/yaşayış məntəqəsi

**suburban** [sə'bə:bən] *adj* 1. şəhərətrafı; **a ~ shop** şəhərətrafı mağaza; 2. əyalət, geridə qalmış, avam; **a ~ outlook on life** həyata əyalət baxışı; **a ~ town** əyalət şəhəri

**subvention** [səb'venʃn] *n* maddi yardım, maliyyə yardımı, pul köməyi; dotasiya *(müəssisələrə dövlət tərəfindən verilən pul)*

**subversion** [sʌb'və:ʃn] *n* 1. devirmə; 2. təxribatçılıq fəaliyyəti

**subversive¹** [səb'və:sıv] *n* təxribatçılıq fəaliyyəti ilə məşğul olan adam

**subversive²** [səb'və:sıv] *adj* 1. təxribatçılıq, ziyankarlıq; **~ activities** təxribatçılıq fəaliyyətləri; 2. dağıdıcı, məhvedici; zərərli, zərərverici; **~ ideas** zərərli fikirlər/ideyalar

**subvert** [səb'və:t] *v* 1. dağıtmaq, devirmək; 2. əxlaqını pozmaq, yoldan çıxartmaq, pis yola çəkmək; mənəviyyatını pozmaq; 3. pozmaq *(qanunu və s.)*

**subway** ['sʌbweı] *n* 1. tunel *(adamların keçməsi üçün)*; **to use the ~ to cross the road** yolu keçmək üçün tuneldən istifadə etmək; 2. *amer.* yeraltı dəmir yolu; metro

**succeed** [sək' si:d] *v* 1. çatmaq, yetişmək; məqsədə nail olmaq; *The attack succeeded Hücum baş tutdu*; 2. müvəffəq olmaq, müvəffəqiyyət qazanmaq; **to ~ in *one's* business** işlərində müvəffəqiyyət qazanmaq; **to ~ in doing *smth.*** bir iş görməkdə müvəffəqiyyət qazanmaq; 3. izləmək, biri digərini əvəz etmək/əvəzləmək; *Night succeeds day Gecə gündüzü əvəz edir*; 4. **(to)** irsən almaq; varis olmaq; **a right to ~** varis olmaq hüququ; **to ~ to *one's* father's estate** irsən atanın malikanəsinə sahib olmaq; **to ~ *smb.* on the throne** taxt-taca sahib olmaq üçün bir kəsin varisi olmaq; 5. gur böyümək, çiçək açmaq *(bitki haq.)*; *The plant succeeds Bitki gur böyüyür*

**succeeding** [sək'si:dıŋ] *adj* sonrakı, sonra gələn; **the ~ letter** sonrakı məktub/hərf; **all ~ ages** bütün sonrakı/ sonra gələn əsrlər

**success** [sək'ses] *n* müvəffəqiyyət, nailiyyət; uğur; **sudden ~** gözlənilməz müvəffəqiyyət/nailiyyət/uğur; **to achieve ~** müvəffəqiyyət/uğur qazanmaq; **to wish *smb.* ~** bir kəsə müvəffəqiyyət/uğur arzulamaq; **to have great ~ in life** həyatda böyük uğur qazanmaq; *The experiment was a success Təcrübə uğurla/ müvəffəqiyyətlə*

*keçdi; Success attend you! Sənə/Sizə uğur olsun!*
◊ *Success is never blamed* ≅ *Qalibləri mühakimə etmirlər; Nothing succeeds like success Uğur uğur gətirər*

**successful** [sək'sesfl] *adj* 1. uğurlu, uğur qazanan, müvəffəqiyyətli; **a ~ plan** uğurlu plan; **a ~ play** uğur qazanan pyes; 2. xoşbəxt, bəxtli, bəxtəvər; *He had all the appearance of a successful man Onun görkəmində xoşbəxt/bəxtəvər adama xas olan hər şey vardı*

**successfully** [sək'sesfəlı] *adv* müvəffəqiyyətlə, uğurla; **to finish *one's* work ~** işini uğurla /müvəffəqiyyətlə qurtarmaq

**succession** [sək'seʃn] *n* 1. varislik, vərəsəlik; **in ~ to *smb.*** bir kəsin varisi; 2. varis, vərəsə, xələf; *He had no fit succession Onun münasib varisi yox idi*; 3. ardıcıllıq; **in ~** dalbadal, bir-birinin ardınca/dalınca; **for five years in ~** dalbadal beş ilə; *Disasters came in succession Fəlakətlər dalbadal gəldi*; 4. cərgə, sıra; **a ~ of remarkable victories** bir sıra gözəl qələbələr; 5. varislik, vərəsəlik; **law of ~** varislik qanunu; **to get a title by ~** varislik yolu ilə titul almaq

**successive** [sək'sesıv] *adj* dalbadal, bir-birinin ardınca/dalınca, ardıcıl; *Our team won six successive games Bizim komanda dalbadal altı oyunda qalib gəldi*

**successively** [sək'sesıvlı] *adv* ardıcıl olaraq, dalbadal

**successor** [sək'sesəʳ] *n* varis, vərəsə; vəliəhd

**succour**[1] ['sʌkəʳ] *n* kömək *(çətin anda göstərilən)*; **timely/unexpected ~** vaxtında/gözlənilməz kömək; **to come to *smb.'s* ~** bir kəsin köməyinə gəlmək, bir kəsi xilas etmək

**succour**[2] ['sʌkəʳ] *v* kömək göstərmək/etmək, köməyə gəlmək *(çətin anda)*

**succulent** ['sʌkjələnt] *adj* şirəli; sulu; dadlı, ləzzətli *(xüs. meyvə və ət haq.)*; **~ roasted meat** qızardılmış dadlı ət; **a ~ pear/peach/apple** sulu armud/şaftalı/ alma

**succumb** [sə'kʌm] *v* 1. dözməmək, tab gətirməmək; güzəşt etmək, güzəştə getmək; **to ~ to superior force** üstün qüvvə qarşısında güzəştə getmək; 2. məhv olmaq, ölmək; **to ~ to cancer** xərçəngdən ölmək

**such**[1] [sʌtʃ] *adj* belə, bu cür/kimi; **~ people** belə/bu cür adamlar; **in ~ a way** beləliklə, bu yolla; *I've never said such things Mən heç vaxt belə şeylər deməmişəm; There are no such doings now İndi belə şeylər olmur*; **~ good music** belə qəşəng musiqi; **~ as** 1) məsələn; **languages coming from Latin, ~ as, French, Italian, Spanish** latın dilindən törəmiş dillər, məsələn, fransız, italyan, ispan dilləri; 2) kimi; **~ beauty as hers** onunku kimi gözəllik; 3) belə; elə; **~ a day** belə bir gün; *His illness was not such as to cause anxiety Onun xəstəliyi elə deyildi ki, narahatlıq/əndişə törədəydi*
◊ *Such master, such man at. söz.* ≅ *Mal yiyəsinə/ sahibinə oxşayar*

**such**[2] [sʌtʃ] *pron.* belə; *Such was his nature Onun xarakteri/xasiyyəti belə idi; Such are the results Nəticələr belədir*; **as ~** özü-özlüyündə; *A name as such means nothing Belə adın özü-özlüyündə heç bir mənası yoxdur*

**suck**[1] [sʌk] *n* 1. sorma; **to have/to take a ~ at a sweet** konfet sormaq; 2. əmmə; ana südü; **to give ~ to a child, to give a child ~** uşağı əmizdirmək, uşağa döş vermək

**suck**[2] [sʌk] *v* sormaq; əmmək; **to ~ a sweet** konfet sormaq; **to ~ the juice from an orange** portağalın suyunu/şirəsini sormaq; *The child won't suck Uşaq əmmir/döş götürmür*;
◊ **to ~ *smb.'s* brain** başqasının fikrinə sahib çıxmaq/olmaq

**suckle** [sʌkl] *v* 1. döş vermək, döşlə yedirtmək, əmizdirmək; 2. əmmək *(döşü, əmcəyi)*

**suckling** ['sʌklıŋ] *n* 1. südəmər uşaq; 2. təcrübəsiz adam

**suction** ['sʌkʃn] *n* sorma, əmmə

**suction-pump** ['sʌkʃnpʌmp] *n* sorucu nasos

**sudden** ['sʌdn] *adj* 1. qəfil, qəfildən, gözlənilməz, birdən; **~ shower** gözlənilməz/qəfil leysan; **~ death** gözlənilməz/qəfil ölüm; 2. tələsik; **~ departure** tələsik yola düşmə; **to take a ~ decision** tələsik qərar qəbul etmək; **all of a ~** qəflətən, gözlənilmədən, qəfildən

**suddenly** ['sʌdnlı] *adv* qəflətən, qəfildən, gözlənilmədən, birdən, birdən-birə

**suddenness** ['sʌdnnıs] *n* gözlənilməzlik, gözlənilməz hadisə

**suds** [sʌdz] *n* 1. sabun köpüyü; 2. *amer. jarq.* pivə

**sue** [su:, sju:] *v* 1. məhkəmə vasitəsilə təqib etmək, iş qaldırmaq, şikayət vermək; iddiaçı qismində çıxış etmək; **to ~ for divorce** boşanmaq haqqında məsələ qaldırmaq; **to ~ *smb.* for libel** böhtanla əlaqədar olaraq bir kəsə qarşı iş qaldırmaq; 2. xahiş/rica etmək, istəmək, yalvarmaq; **to ~ (to) *smb.* for *smth.*** bir kəsdən bir şeyi xahiş/rica etmək; **to ~ an enemy for mercy** düşmənə əfv üçün yalvarmaq, düşməndən aman istəmək/diləmək

**suede** [sweıd] *n fr.* zamşa *(yumşaq maral dərisi)*

**suffer** ['sʌfəʳ] *v* 1. əziyyət çəkmək; **to ~ acutely** bərk əziyyət çəkmək; **to ~ pain/thirst** ağrıdan/ susuzluqdan əziyyət çəkmək; **to ~ from *smth.*** bir şeydən əziyyət çəkmək; **to ~ from headaches** baş ağrılarından əziyyət çəkmək; 2. məruz qalmaq, düçar olmaq; **to ~ heavily** *hərb.* böyük itki vermək; **to ~ a defeat** məğlubiyyətə məruz qalmaq; 3. imkan vermək; **to ~ *smb.* to do *smth.*** bir kəsə bir şey etməyə imkan vermək; 4. dözmək; **to ~ criticism** tənqidə dözmək; *He couldn't suffer criticism O, tənqidə dözə bilmədi*; 5. cəzalandırılmaq, cəza verilmək; cəza çəkmək *(həm də* **to ~ a punishment***)*; **to ~ for *one's* carelessness** diqqətsizliyinə görə/diqqətsizliyi ucbatından cəzalanmaq/əziyyət çəkmək



**sufferable** ['sʌfərəbl] *adj* dözülə bilən; dözümlü, yol verilə bilən; **~ pain** dözülə bilən ağrı

**sufferance** ['sʌfərəns] *n* dözüm, dözümlülük

**sufferer** ['sʌfərəʳ] *n* zərər görmüş, ziyana düşmüş *(adam)*, ziyan çəkmiş

**suffering** ['sʌfərıŋ] *adj* əzab/əziyyət/iztirab çəkən

**sufferings** ['sʌfərıŋz] *n* əzab, əziyyət, cəfa, möhnət, dərd, iztirab

**suffice** [sə'faıs] *v (davamedici zaman formalarında işlənmir)* 1. kifayət etmək, çatmaq; **to ~ for *smb.'s* needs** bir kəsin ehtiyaclarını ödəməyə kifayət etmək/çatmaq; *$1000 will suffice for my needs 1000$ mənim ehtiyaclarımı ödəyər*; 2. təmin etmək, razı salmaq; **to ~ *smb.*** bir kəsi razı salmaq;
◊ *Suffice it to say (that)... Demək kifayətdir ki, ...*

**sufficiency** [sə'fıʃnsı] *n* kifayət etmə, çatma, kafilik; **a ~ of food** ərzağın kifayət etməsi/ çatması

**sufficient** [sə'fıʃnt] *adj* lazımi/kifayət qədər; **~ money/time/fuel** lazımi qədər pul/vaxt/ yanacaq; *This sum is sufficient for the journey Bu məbləğ səyahət üçün kifayətdir; Is not my word sufficient? Məgər mənim sözüm kifayət deyilmi?*

**sufficiently** [sə'fıʃntlı] *adv* lazımınca, kifayət qədər, olduqca, xeyli

**suffism** ['su:fızm] *n* sufizm, sufilik

**suffix**[1] ['sʌfıks] *n dilç.* suffiks

**suffix**[2] ['sʌfıks] *v dilç.* suffiks əlavə etmək

**suffocate** ['sʌfəkeıt] *v* boğulmaq; *Many passengers suffocated in the burning aircraft Yanan təyyarədə çox sərnişin boğuldu; I'm suffocated in here. Can we open the window? Mən burada boğuluram. Pəncərəni aça bilərikmi?*; **to ~ with rage** qəzəbdən/ acıqdan boğulmaq

**suffocating** ['sʌfəkeıtıŋ] *adj* 1. boğucu, boğan; **~ gas** boğucu qaz; **the ~ heat** boğucu isti; 2. boğulan

**suffocation** [ˌsʌfə'keıʃn] *n* 1. boğma, boğulma; 2. təngnəfəslik, nəfəs tutulması, təngişmə

**suffrage** ['sʌfrıdʒ] *n* 1. səsvermə, səsvermədə iştirak etmə; 2. səsvermə hüququ; **female /woman ~** qadının səsvermə hüququ; **universal ~** ümumi səsvermə hüququ

**suffuse** [sə'fju:z] *v* 1. axıtmaq *(göz yaşı)*; 2. örtmək; *Her cheeks were suffused with tears Onun yanaqları göz yaşları ilə örtülmüşdü*

**sugar**[1] ['ʃugəʳ] *n* qənd, şəkər; **a lump of ~** bir parça şəkər/qənd; **granulated ~** qənd/şəkər tozu; *Don't eat much sugar Çox qənd/şəkər yemə/yeməyin*

**sugar**[2] ['ʃugəʳ] *v* 1. şirinləşdirmək, üstünə qənd /şəkər səpmək; 2. *məc.* şirin etmək, şirinləşdirmək; **to ~ *one's* words** sözlərini şirinləşdirmək, yaltaqlanmaq

**sugar-basin** ['ʃugəˌbeısn] *n* qəndqabı, qənddan

**sugar beet** ['ʃugəbi:t] *n bot.* qənd/şəkər çuğunduru

**sugar-cane** ['ʃugəkeın] *n bot.* qənd/şəkər qamışı

**sugar-daddy** ['ʃugə'dædı] *n amer. d.d.* yaşlı dövlətli pərəstişkar/aşiq

**sugared** ['ʃugəd] *adj* 1. qənd/şəkər səpilmiş, qəndlə/şəkərlə örtülmüş; 2. xarlamış; **~ honey** xarlamış bal

**sugar-house** ['ʃugəhaus] *n* qənd/şəkər zavodu

**sugarless** ['ʃugəlıs] *adj* qəndsiz, şəkərsiz

**sugary** ['ʃugərı] *adj* 1. şirin; şəkərli, tərkibində şəkər olan; 2. şirintəhər, şirinhal; çox şirin; 3. yaltaq

**suggest** [sə'dʒest] *v* 1. təklif etmək; məsləhət etmək; *I suggest to go to the beach Mən təklif edirəm ki, çimərliyə gedək; There's something I want to suggest to you Mən istəyirəm sənə/sizə bir məsləhət/təklif verim; I'll do as you suggest Necə məsləhət görsən/görsəniz, elə də edəcəm*; 2. təlqin etmək *(fikri, ideyanı və s.)*, fikrinə/yadına salmaq; demək, danışmaq; *What does this shape suggest to you Bu forma sənin/sizin yadına/yadınıza nə salır?*

**suggestibility** [sə'dʒestı'bılıtı] *n* təsirlənmə qabiliyyəti, təlqinə qabillik, inanma

**suggestible** [sə'dʒestəbl] *adj* təlqinə/təsirə məruz qalan; təlqin olunan

**suggestion** [sə'dʒestʃən] *n* 1. təklif, məsləhət; **practical ~** əməli təklif/məsləhət; **to make/to offer a ~** 1) təklif vermək; *I've a suggestion to make Mənim (ediləsi) bir təklifim var*; 2) fikir söyləmək, ideya vermək; 2. işarə, əlamət; **a ~ of weariness** yorğunluq əlaməti; 3. təlqin etmə, inandırma; **cure by ~** təlqin (etmə) ilə müalicə; 4. mümkün olan ehtimal/güman/təxmin; *My suggestion is that you were not there at that time Mənim ehtimalım belədir ki, sən/siz o vaxt orada olmamısan/olmamısınız*

**suggestive** [sə'dʒestıv] *adj* 1. fikir oyadan; fikirləşməyə məcbur edən; **a ~ chapter** fikirləşməyə məcbur edən fəsil; 2. nalayiq məqsədlə edilən; *The man gave her a suggestive wink, and the young lady blushed Kişi nalayiq məqsədlə gənc xanıma göz vurdu, o isə qızardı*

**suicidal** [ˌsu:ı'saıdl] *adj* təhlükəli, qorxulu, xətərli, fəlakətli, zərərli; **~ policy** fəlakətli /təhlükəli siyasət

**suicide**[1] ['sjuısaıd] *n* 1. özünü öldürmə, intihar, intihar etmə; **to commit ~** özünü öldürmək, intihar etmək; 2. özünü öldürən, intihar edən

*(adam)*; **three ~s in one week** bir həftədə üç intihar; 3. iflas, iflas etmə, boşa çıxma *(plan, ümid və s. haq.)*; **political/economic ~** siyasi/iqtisadi iflas

**suicide²** ['sjuısaıd] *v* özünü öldürmək, intihar etmək *(həm də* **to ~ oneself)**

**suit¹** [sju:t] *n* 1. kişi/qadın kostyumu; 2. komplekt; **a two-piece ~** yubka və jaket; 3. ərizə, xahiş; **~ for pardon** bağışlanma haqqında ərizə/xahiş; **at *smb.'s* ~, at the ~ of *smb.*** bir kəsin xahişi ilə; **to hear *smb.'s* ~** bir kəsin xahişinə qulaq asmaq; **to grant *smb.'s* ~** bir kəsin xahişini yerinə yetirmək; 4. uyğunluq, razılıq; **in ~ with *smb.*** bir kəsin razılığı ilə; 5. *hüq.* iddia, tələb; məhkəmə işi; məhkəmə prosesi; **criminal ~** cinayət işi; **civil ~** mülki iş; **to bring a ~ against *smb.*** bir kəsə qarşı iddia qaldırmaq; 6. mast *(qumar kağızlarında dörd rəngdən biri)*;

◊ **to follow ~** təqlid etmək, nümunə götürmək; *The others followed suit Başqaları nümunə götürdülər*

**suit²** [sju:t] *v* 1. tələbi ödəmək, təmin etmək, əl vermək; *This suits me best Bu mənə tamamilə əl verir; Suit yourself Necə istəyirsən/istəyirsiniz elə də et/edin*; 2. xeyirli/faydalı olmaq; *Cold doesn't suit me Soyuq mənə ziyandır*; 3. yaramaq, münasib/yararlı/gərəkli olmaq; **to be ~ed for/to *smth.*** bir şeyə yaramaq; *He is not suited to be a teacher O, müəllimliyə yaramır*; 4. yaraşmaq; *This hat suits you Bu şlyapa sənə/sizə yaraşır*; 5. uyğunlaşdırmaq, düzəltmək; **to ~ *smth.* to *smth.*** bir şeyi bir şeyə uyğunlaşdırmaq; 6. təmin etmək; **to ~ oneself with *smth.*** özünü bir şeylə təmin etmək

**suitability** [,sjutə'bılıtı] *n* uyğunluq, müvafiqlik, mütabiqlik, bərabərlik; yararlılıq

**suitable** ['sju:təbl] *adj* münasib, əlverişli; yarayan, uyğun gələn/olan, uyğun, müvafiq; **a ~ place for a picnic** gəzinti/piknik üçün münasib yer; **clothes ~ for cold weather** soyuq hava üçün əlverişli paltar; **a ~ day/hour** əlverişli gün/saat; **to be ~ to/for *smth.*** bir şeyə uyğun /müvafiq gəlmək; *Is she suitable for the job? O, işə yarayırmı?*

**suitableness** ['sju:təblnıs] *n* = **suitability**

**suitably** ['sju:təblı] *adv* ...müvafiq, ...müvafiq olaraq, ...uyğun olaraq; ...müvafiq surətdə; **to answer ~** müvafiq olaraq cavab vermək; **to act ~** müvafiq/uyğun olaraq hərəkət etmək; **to dress ~** müvafiq/uyğun olaraq geyinmək

**suit-case** ['sju:tkeıs] *n* paltar çamadanı

**suite** [swi:t] *n* 1. svita, məiyyət *(böyük bir şəxsin müşayiətçiləri)*; **the President and his ~** Prezident və onun svitası; 2. dəst, komplekt; qarnitur; **a ~ of furniture** bir mebel dəsti/komplekti; 3. lüks *(mehmanxanada)*; *The suite consists of a bedroom, a bath-room and a sitting-room Lüks yataq otağından, hamamxanadan və ümumi otaqdan ibarətdir*; 4. *mus.* süita *(musiqi əsəri)*

**suitor** ['su:tə<sup></sup>] *n* 1. pərəstişkar, aşiq; *She has rejected all her suitors O, pərəstişkarlarının hamısını rədd edib*; 2. iltimasçı, ərizəçi, xahiş edən, ərizə verən; 3. *hüq.* iddiaçı

**sulk** [sʌlk] *v* acığı tutmaq, acıq etmək, qaşqabaq/mısmırıq sallamaq, küsmək; **to ~ with *smb.*** bir kəsə acığı tutmaq/qaşqabaq tökmək

**sulkily** ['sʌlkılı] *adv* qaşqabaqla, dilxor/pərt/ qaşqabaqlı bir halda/tərzdə

**sulkiness** ['sʌlkınıs] *n* dilxorluq, qaşqabaqlılıq, pərtlik, tutqunluq

**sulks** [sʌlks] *n* pis ovqat/əhvali-ruhiyyə; **to be in the ~** pis ovqatda olmaq, ovqatı/kefi pis olmaq

**sulky** ['sʌlkı] *adj* 1. qaşqabaqlı, pərt, dilxor, qaraqabaq; **to be ~** qaşqabaq tökmək, dilxor/pərt olmaq; **to look ~** qaşqabaqlı/pərt görünmək; **to be ~ with *smb.*** bir kəsə qaşqabaq göstərmək; 2. tutqun, cansıxıcı *(hava və s. haq.)*; **a ~ day** tutqun gün; 3. yavaş, ağır, asta *(hərəkət və s. haq.)*

**sullen** ['sʌlən] *adj* 1. qaşqabaqlı, qaraqabaq, üzügülməz; **a ~ man** qaşqabaqlı/qaraqabaq/ üzügülməz adam; 2. tutqun, əzici, sıxıcı; **a ~ sky** tutqun səma; 3. tutqun, solğun, donuq *(boya, rəng haq.)*; 4. həzin, alçaq *(səs haq.)*; 5. höcət, tərs, inad, kəc *(əsas. heyvan haq.)*

**sullenly** ['sʌlənlı] *adv* pərt, qaşqabaqla, qaşqabaqlı bir halda/tərzdə

**sullenness** ['sʌlənnıs] *n* qaşqabaqlılıq, pərtlik; tutqunluq, qaraqabaqlıq, üzügülməzlik, sərtlik

**sully** ['sʌlı] *v (pt, pp* **sullied)** ləkələmək; korlamaq; **to ~ *smb.'s* reputation** bir kəsin adını /şöhrətini ləkələmək

**sulpho-acid** ['sʌlfou'æsıd] *n kim.* sulfat turşusu

**sum¹** [sʌm] *n* 1. məbləğ, miqdar; nəticə *(həm də* **~ total)**; **a ~ of money** pulun məbləği/miqdarı; **to pay a great ~ for *smth.*** bir şeyə böyük məbləğdə pul vermək; 2. *d.d.* hesabdan tapşırıq/misal; **to do ~s** hesabdan tapşırıq/misal etmək; 3. *pl* hesab *(fənn mənasında)*; **to be good/bad at ~s** hesabı yaxşı/pis bilmək, hesabdan güclü/zəif olmaq; 4. son məqsəd/ nöqtə; **the ~ of human bliss** bəşər xoşbəxtliyinin son/ən yüksək nöqtəsi;

◊ **in ~** ümumiyyətlə, qısaca

**sum²** [sʌm] *v* 1. üstə gəlmək, nəticə vurmaq *(həm də* **to ~ up)**; 2. bərabər/ibarət olmaq; **to ~ up** 1) yekun vurmaq, yekunlaşdırmaq; **to ~ up what has been said** deyilənlərə yekun vurmaq; 2) qiymətləndirmək; **to ~ *smb./smth.*** bir kəsi/şeyi qiymətləndirmək; **to ~ up the situation at a glance** bir baxışda vəziyyəti qiymətləndirmək

**summarize, -ise** ['sʌməraız] *v* yekunlaşdırmaq, yekun vurmaq; **to ~ the result of the talk** söhbətin nəticəsini yekunlaşdırmaq

**summary¹** ['sʌmərı] *n* xülasə, nəticə, icmal



**summary²** ['sʌmərı] *adj* 1. qısa; yekun, yekunlaşdırıcı; **~ account** qısa hesabat; 2. tez, cəld; təxirsiz, təxirəsalınmaz

**summer¹** ['sʌmə<sup></sup>] *n* yay; **in ~** yayda; **this /next/ last ~** bu /gələn/keçən yay; **a cool/hot ~** sərin/ isti yay

**summer²** ['sʌmə<sup></sup>] *adj* yay; **~ clothes** yay paltarı; **~ vacation** yay tətili; **~ term** yay semestri; **~ camp** yay düşərgəsi; **~ holidays** yay məzuniyyəti/tətili

**summer³** ['sʌmə<sup></sup>] *v* yayı keçirmək; **to ~ in the village** yayı kənddə keçirmək; **to ~ abroad** yayı xaricdə keçirmək

**summer-house** ['sʌməhaus] *n* bağ, bağ evi

**summit¹** ['sʌmıt] *n* 1. təpə, baş; zirvə; **the ~ of the mountain** dağın təpəsi/zirvəsi/başı; **the ~ of happiness** xoşbəxtliyin zirvəsi; 2. *riyaz.* təpə; **the ~ of an angle** bucağın təpəsi

**summit²** ['sʌmıt] *adj* yüksək səviyyəli; **~ conference/meeting** yüksək səviyyəli konfrans/iclas; **a ~ talk** yüksək səviyyəli danışıq

**summon** ['sʌmən] *v* 1. çağırmaq *(məhkəməyə və s.)*; **to ~ a witness** *hüq.* şahid çağırmaq; 2. yerinə yetirməyi tələb etmək; **to ~ *smb.* to do *smth.*** bir şeyi etməyi bir kəsdən tələb etmək; **to ~ a town to surrender** şəhəri təhvil verməyi tələb etmək; 3. çağırmaq; **to ~ Parliament** Parlamenti çağırmaq; *The Queen has summoned Parliament Kraliça parlamenti çağırıb*; 4. toplamaq; **to ~ *one's* courage** cəsarətini toplamaq; **to ~ up all *one's* strength** bütün/var gücünü toplamaq

**summons¹** ['sʌmənz] *n* 1. çağırış, çağırma, dəvət, dəvət etmə; 2. *hüq.* çağırış vərəqəsi *(məhkəməyə)*; **to serve *smb.* with ~** məhkəməyə gəlmək üçün bir kəsə çağırış vərəqəsi vermək

**summons²** ['sʌmənz] *v hüq. d.d.* məhkəməyə çağırmaq

**sumptuous** ['sʌmptʃuəs] *adj* baha, çox qəşəng /gözəl; təntənəli; dəbdəbəli; **~ clothes** çox gözəl/ qəşəng/ bahalı paltar; **~ feast** təntənəli/dəbdəbəli ziyafət

**sumptuously** ['sʌmptʃuəslı] *adv* çox gözəl/qəşəng, təmtəraqlı, dəbdəbəli, əla; **~ dressed** çox gözəl/qəşəng/dəbdəbəli geyinmiş

**sumptuousness** ['sʌmptʃuəsnıs] *n* calal, cah-calal, dəbdəbə, təmtəraq, əzəmət, ehtişam, büsat

**sun¹** [sʌn] *n* 1. *(həm də* **the sun)** günəş; *The sun rises in the east Günəş şərqdən çıxır*; **(the ~)** günəş işığı/istisi/şüası; **to sit in the ~** günəş altında oturmaq; **to bask in the ~** günəşdə qaralmaq; *Don't lie in the sun all day Bütün günü günəş altında uzanma/uzanmayın; The sun is in my eyes Günəş/ Günəşin işığı gözümə düşür*; 2. ulduz *(xüs. ətrafına peyk dolanan)*;

◊ **under the ~** bu dünyada; **to hold a candle to the ~** boş işlə məşğul olmaq, boş-boş vaxt itirmək; **to see the ~** yaşamaq; *Make hay while the sun shines at. söz. ≅ Dəmiri istikən/isti-isti döyərlər*

**sun²** [sʌn] *v* 1. özünü günəşə vermək; günəşdə qaralmaq *(həm də* **to ~ oneself)**; 2. günəşdə qurutmaq, günəşə vermək *(xalçanı, yorğanı və s.)*

**sun-baked** ['sʌnbeıkt] *adj* günəşdə qurudulmuş

**sun-bath** ['sʌnba:θ] *n* günəş vannası

**sun-bathe** ['sʌnbeıð] *v* günəşdə qaralmaq

**sunbeam** ['sʌnbi:m] *n* günəş şüası

**sun-blind** ['sʌnblaınd] *n* pəncərə pərdəsi, jalüzi *(nazik taxtadan və s. qayrılan pəncərə pərdəsi)*

**sun-bow** ['sʌnbau] *n* göy qurşağı, qövsi-qüzeh

**sun-bright** ['sʌnbraıt] *adj şair.* günəş kimi parlaq/parlayan

**sun-burn¹** ['sʌnbə:n] *n* 1. qaralma, yanma *(günəşdən)*; 2. *tib.* günəş yanığı

**sun-burn²** ['sʌnbə:n] *v* 1. yanmaq, qaralmaq *(günəşdən)*; 2. özünü günəşdə yandırmaq

**sun-burned** ['sʌnbə:nd] *adj* yanmış, qaralmış *(günəşdən)*; **~ soldiers** günəşdən qaralmış/yanmış əsgərlər

**sun-burnt** ['sʌnbə:nt] *adj* = **sun-burned**

**Sunday** ['sʌndeı, -dı] *n* bazar; **on ~** bazar günü; *He'll come to visit you on Sunday O, bazar günü sənə/sizə baş çəkməyə gələcək*;

◊ ***one's* ~ best** ən yaxşı paltar; *I'll put on my Sunday best Mən ən yaxşı paltarımı geyəcəm; When two Sundays come together ≅ Qum göyərəndə, Dəvənin quyruğu yerə dəyəndə*

**Sunday-school** ['sʌndısku:l] *n* bazar günü məktəbi

**sun-dial** ['sʌndaıəl] *n* günəş saatı

**sun-disk** ['sʌndısk] *n* günəş haləsi

**sundown** ['sʌndaun] *n* qürub, batma *(günəş, ay)*; gün batan çağı, qürub zamanı/vaxtı

**sun-dry** ['sʌndraı] *v* günəşdə qurutmaq, günəşə vermək

**sundry** ['sʌndrı] *adj d.d.* müxtəlif, çeşidli, cürbəcür; **books, pens, and ~ other articles** kitablar, qələmlər və müxtəlif/cürbəcür başqa şeylər; **~ items of food** cürbəcür ərzaq şeyləri; **to talk of ~ matters** cürbəcür şeylərdən/ordan-burdan danışmaq

**sunflower¹** ['sʌn,flauə<sup></sup>] *n bot.* günəbaxan

**sunflower²** ['sʌn,flauə<sup></sup>] *adj* günəbaxan; **~ seeds** tum; **~ oil** günəbaxan yağı; **to nibble ~ seeds** tum çırtlamaq

**sung** [sʌŋ] **to sing** *felinin pt və pp formaları*

**sun-glasses** ['sʌn,gla:sız] *n* günəş eynəyi /gözlüyü

**sun-hat** ['sʌnhæt] *n* günəş şlyapası *(kənarları enli)*

**sunk** [sʌŋk] **to sink** *felinin pt, pp formaları*

**sunken** ['sʌŋkən] *adj* batmış, batıq; çökmüş, çökük; **a ~ ship** batmış gəmi; **~ cheeks** batıq /çökük ordlar; **~ eyes** batıq/çökük gözlər

**sunless** ['sʌnlɪs] *adj* günəşsiz; tutqun, buludlu; **a ~ day** günəşsiz/tutqun/buludlu gün
**sunlight** ['sʌnlaɪt] *n* günəş işığı; **bright/strong ~** parlaq/güclü günəş işığı; **in the ~** günəş işığında, gündüz
**sunlit** ['sʌnlɪt] *adj* günəşli, günəşlə işıqlandırılmış; **a ~ garden/room** günəşli bağ/otaq
**sunny** ['sʌnɪ] *adj* 1. günəşli; günəş düşən; **a ~ room** günəşli/günəş düşən otaq; **a ~ side** günəş düşən tərəf; 2. şad, şux, fərəhli, ürəkaçan, fərəhləndirici, sevindirici; **~ smile** fərəhli təbəssüm; 3. günəşəoxşar, günəşəbənzər, günəş kimi
**sunset** ['sʌnset] *n* 1. qürub, batma *(günəş, ay)*; qürub çağı/zamanı; **at ~** qürub zamanında/çağında, gün batan zaman; 2. son/axır çağı, süqut; **the ~ of life** ömrün son çağı; **the ~ of an empire** imperiyanın sonu/süqutu
**sunshade** ['sʌnʃeɪd] *n* 1. günəş çətiri, günəşdən qorunmaq üçün çətir; 2. talvar, çardaq, tent, örtük, günlük
**sunshine** ['sʌnʃaɪn] *n* 1. parlaq günəş işığı; **in the ~** günəşdə, günəş altında; **to sit/to bask in the ~** günəş altında oturmaq/qaralmaq; 2. yaxşı günəşli hava; 3. şadlıq, sevinc, xoşbəxtlik; çiçəklənmə; 4. sevincin/xoşbəxtliyin səbəbi
**sunspot** ['sʌnspɔt] *n* 1. çil *(dəridə, üzdə)*; 2. *astr.* günəş ləkəsi
**suntan** ['sʌntæn] *n* qaralma, yanma *(günəşdən)*; **to get a ~** yanmaq, qaralmaq *(günəşdən)*
**sunwise** ['sʌnwaɪz] *adv* günəşə doğru, günəş istiqamətində
**sunworship** ['sʌn.wə:ʃɪp] *n* günəşə sitayiş
**sup[1]** [sʌp] *n* udum, qurtum; **to take a ~ of *smth.*** bir şeydən bir udum/qurtum götürmək/almaq
**sup[2]** [sʌp] *v* 1.şam etmək, şam yeməyi yemək; **to ~ with a friend** dostla şam etmək; 2. şam vermək, şam yeməyi vermək; 3. dadmaq, duymaq, görmək; **to ~ sorrow** dərd/qüssə dadmaq; 4. bir dəfəyə/birnəfəsə içmək;
◊ *He that sups with the devil needs a long spoon ≅ İtlə dost olanın əlində çomağı gərək*
**superficial** [.sju:pə'fɪʃl] *adj* 1. üzdən, dayaz; **a ~ wound** dayaz yara; 2. qeyri-ciddi, səthi; **a ~ book** səthi kitab; **~ knowledge/learning** səthi bilik/təhsil; 3. xarici, zahiri; **~ resemblance** xarici/zahiri oxşarlıq
**superficialism** [.sju:pə'fɪʃəlɪzm] *n* səthilik, yüngüllük, qeyri-ciddilik; əsassızlıq
**superficiality** [.sju:pə'fɪʃɪ'ælɪtɪ] *n* səthilik, qeyri-ciddilik, ciddiyyətsizlik
**superficially** [.sju:pə'fɪʃəlɪ] *adv* üzdən, səthi, səthi olaraq, ötəri, başdansovma
**superfine** ['sju:pəfaɪn] *adj* 1. birinci dərəcəli, əla, keyfiyyətli, yüksək növlü *(xüs. ticarətdə)*; **~ cloth** yüksək keyfiyyətli paltar; **~ flour** yüksək keyfiyyətli/əla növ un; 2. incə, zərif
**superfluity** [.sju:pə'flu:ətɪ] *n* 1. bolluq, çoxluq; firavanlıq; **~ of good things** yaxşı şeylərin bolluğu/ çoxluğu; **~ of words** sözlərin çoxluğu; 2. artıqlıq; **a ~ of helpers** köməkçilərin çoxluğu/artıqlığı; **to have a ~ of hands** artıq fəhləsi olmaq
**superfluous** [su:'pə:fluəs] *adj* artıq, çox, çoxlu, lazım olduğundan artıq; **to be ~** artıq olmaq; *I soon realized that I was superfluous, and left Mən tezliklə başa düşdüm ki, mən artığam və çıxıb getdim*
**superfluously** [su:'pə:fluəslɪ] *adv* çox, çoxlu, artıq, həddən artıq/çox
**superheat[1]** ['sju:pəhi:t] *n* çox/bərk qızma, çox /bərk qızdırma; həddən artıq qızma/qızdırma
**superheat[2]** ['sju:pəhi:t] *v* bərk/çox/həddən artıq qızdırmaq
**superhuman** [.sju:pə'hju:mən] *adj* fövqəlbəşər, insan qüvvəsi xaricində olan; **~ powers** fövqəlbəşər qüvvələr
**superintend** [.sju:prɪn'tend] *v* rəhbərlik/idarə etmək; **to ~ the work** işə rəhbərlik/işi idarə etmək
**superintendence** [.sju:prɪn'tendəns] *n* idarə etmə; idarə, nəzarət, nəzarət etmə, göz yetirmə
**superintendent** [.sju:prɪn'tendənt] *n* 1. idarə/rəhbərlik edən adam, müdir, idarə başçısı/rəhbəri; 2. nəzarətçi, keşikçi, gözətçi
**superior[1]** [su:'pɪərɪə[r], sju:-] *n* 1. rəis, başçı, müdir; *He's your superior O sənin/sizin rəisindir/rəisinizdir*; 2. başqasından üstün olan; *You are my superior Sən/Siz məndən üstünsən /üstünsünüz; He has no superior in wit/in courage Ağılda/İgidlikdə ona tay yoxdur*
**superior[2]** [sju:'pɪərɪə[r], sju:-] *adj* 1. daha yaxşı, üstün, böyük; **~ forces** *hərb.* üstün qüvvələr; **quantitatively ~ enemy** miqdarca üstün düşmən; **~ manpower** *hərb.* miqdarca üstün canlı qüvvə; *The enemy attacked with superior numbers Düşmən miqdarca üstün qüvvə ilə hücum etdi; This machine is superior to that one Bu maşın ondan daha yaxşıdır/üstündür*; 2. çox yaxşı/gözəl, əla, əla keyfiyyətli; *This is superior cloth Bu, əla/çox yaxşı keyfiyyətli mahuddur*; 3. (to) əlçatmaz; misilsiz; yüksək olan; **to be ~ to *smth.*** bir şeydən yüksək olmaq; 4. məğrur; lovğa, təkəbbürlü, dikbaş; *He is a very superior man O çox lovğa/dikbaş/təkəbbürlü adamdır*; **to get ~** lovğalanmaq, özünü öymək, iddia satmaq; 5. üstün, yuxarı *(vəzifəcə, rütbəcə)*; **a ~ body** yuxarı orqan; **a ~ officer** *hərb.* yüksək rütbəli zabit
**superiority** [su:.pɪərɪ'ɔrɪtɪ, sju:-] *n* üstünlük, böyüklük *(yaşa/vəzifəyə/rütbəyə görə)*; **natural ~** təbii üstünlük; **military ~** hərbi üstünlük; **~ in numbers** miqdarca üstünlük
**superlative[1]** [su:'pə:lətɪv, sju:-] *n* 1. *dilç.* üstünlük dərəcəsi *(sifətlərdə, zərflərdə)*; 2. üstünlük dərəcəsində olan sifət/zərf; 3. şişirtmə, mübaliğə, mübaliğə etmə; **to speak in ~** mübaliğəli/mübaliğə ilə danışmaq



**superlative[2]** [su:'pə:lətɪv, sju:-] *adj* 1. ən/çox böyük, ən hündür/uca; **a ~ achievement** çox böyük inkişaf; **~ wisdom** ən böyük müdriklik; **~ beauty** tayı-bərabəri olmayan gözəllik; 2. *dilç.* üstünlük *(dərəcə haq.)*; **the ~ degree** üstünlük dərəcəsi *(sifətdə, zərfdə)*; **the ~ degree of the adjective/of the adverb** sifətin/zərfin üstünlük dərəcəsi
**superlatively** [su:'pə:lətɪvlɪ, 'sju:-] *adv* ən yüksək dərəcədə
**superman** ['su:pəmən, 'sju:] *n (pl* **-men** [-mən]) 1. fövqəlbəşər; 2. supermen
**supermarket** [.su:pə'ma:kɪt, 'sju:-] *n* supermarket *(böyük özünəxidmət mağazası)*
**supernatural** [.su:pə'nætʃrəl, 'sju:-] *adj* 1. fövqəltəbii, qeyri-təbii, xariqüladə; misilsiz, misli olmayan /görünməmiş; **~ being** fövqəltəbii/ xariqüladə varlıq; 2. ilahi; **~ forces** ilahi qüvvələr
**supernaturally** [.su:pə'nætʃrəlɪ, sju:-] *adv* fövqəltəbii/xariqüladə bir tərzdə
**superordinary** [.su:pər'ɔ:dnrɪ, sju:-] *adj* qeyri-adi, müstəsna, qəribə; **~ ability** qeyri-adi qabiliyyət
**superpower** ['su:pəpauə[r], 'sju:-] *n* 1. qeyri-adi güc/qüvvə; 2. güclü/qüvvətli dövlət
**superprofit** [.sju:pə'prɔfɪt, sju:-] *n* üstəlik gəlir / qazanc/mənfəət
**supersede** [.su:pə'si:d, sju:-] *v* 1. əvəz etmək, dəyişmək; **to ~ another as chairman** sədr vəzifəsini başqasına vermək; **to ~ an old machine by a new one** köhnə maşını yenisi ilə əvəz etmək; **to ~ a system** sistemi dəyişmək; *This text-book must be superseded by a newer one Bu dərslik daha yenisilə əvəz olunmalıdır/edilməlidir*; 2. yerini tutmaq, sıxışdırıb aradan çıxartmaq; *The automobile superseded the horse Avtomobil atı sıxışdırıb aradan çıxardı*
**superstition** [.su:pə'stɪʃn, sju:-] *n* mövhumat, xurafat
**superstitious** [.su:pə'stɪʃəs, sju:-] *adj* 1. mövhumatçı, xurafatçı, mövhumata/xurafata inanan; **~ people** mövhumata/xurafata inanan adamlar; 2. mövhumi; **~ beliefs** mövhumi inamlar/əqidələr; **~ customs** mövhumi adətlər/ənənələr
**superstitiousness** [.su:pə'stɪʃəsnɪs, sju:-] *n* mövhumatçılıq, xurafatçılıq
**superstructure** ['su:pəstrʌktʃə[r], 'sju:-] *n* 1. binanın üstünü tikib artırma, sonradan əlavə olunan mərtəbə/qat; 2. *fəls.* üstqurum
**supertax** ['su:pətæks, 'sju:-] *n* əlavə gəlirdən/qazancdan tutulan vergi
**supervise** ['su:pəvaɪz, 'sju:-] *v* nəzarət etmək, göz qoymaq; **to ~ the building work** inşaat işinə nəzarət etmək
**supervision** [.su:pə'vɪʒn, 'sju:-] *n* nəzarət, müşahidə; **under the ~ of *smb.*** bir kəsin nəzarəti/müşahidəsi altında; **to keep *smb.* under strict ~** bir kəsi ciddi nəzarətdə saxlamaq
**supervisor** ['su:pəvaɪzə[r], 'sju:-] *n* nəzarətçi, gözətçi, keşikçi
**supervisory** ['su:pəvaɪzərɪ, 'sju:-] *adj* nəzarətçi; **~ body** nəzarətçi orqan
**supper[1]** ['sʌpə[r]] *n* şam, şam/axşam yeməyi; **at ~** axşam/şam yeməyində; **for ~** şam yeməyi/axşam yeməyi üçün; **after ~** axşam/şam yeməyindən sonra; **to have ~** şam/axşam yeməyi yemək, şam etmək
**supper[2]** ['sʌpə[r]] *v* şam etmək, şam/axşam yeməyi yemək
**supper-time** ['sʌpətaɪm] *n* şam/şam yeməyi vaxtı
**supplant** [sə'pla:nt] *v* 1. sıxışdırıb aradan çıxartmaq; *Buses are supplanting trams Avtobuslar tramvayları sıxışdırıb aradan çıxarır*; 2. çıxmağa məcbur etmək, qovmaq, bir kəsin yerini tutmaq *(güclə, hiyləgərliklə və s.)*
**supple** ['sʌpl] *adj* 1. elastik, asanlıqla əyilə bilən; **~ cane** asanlıqla əyilə bilən qamış/çubuq; 2. çevik, zirək; yumşaq; **~ mind** çevik zəka/ağıl; **~ leather** yumşaq dəri; 3. yolayovuq, üzüyola, tez yola gələn; 4. qulluq göstərən, yarınmağa/xoşa gəlməyə çalışan; yaltaq
**supplely** ['sʌplɪlɪ] *adv* çevik, zirək; yaltaqcasına, yaltaqlıqla
**supplement[1]** ['sʌplɪmənt] *n* əlavə, əlavə etmə *(kitaba, sənədə və s.)*; **~ income** əlavə gəlir; **the ~ to a dictionary** lüğətə əlavə
**supplement[2]** ['sʌplɪmənt] *v* əlavə etmək, tamamlamaq; **to ~ a diet with vitamin tablets** pəhrizə vitamin həbləri əlavə etmək
**supplementary** [.sʌplɪmentrɪ] *adj* əlavə; **~ reserve** əlavə ehtiyat; **a ~ water supply** əlavə su təminatı/təchizatı
**supplicate** ['sʌplɪkeɪt] *v* yalvarmaq, xahiş etmək, yalvarıb razı salmaq; **to ~ *smb.* to do *smth.*** bir şeyi etmək üçün bir kəsə yalvarmaq
**supplication** [.sʌplɪ'keɪʃn] *n* 1. xahiş, yalvarış, yalvarma; 2. ərizə; 3. dua, ibadət
**supply[1]** [sə'plaɪ] *n* 1. ehtiyat; **unexhaustible / fresh ~** tükənməz/təzə ehtiyat; **food supplies** ərzaq ehtiyatı; 2. vəsait; **supplies of money** pul vəsaiti; 3. təmin/təchiz etmə; **~ of a town with food** şəhəri ərzaqla təmin/təchiz etmə; **to make/to sign a contract for the ~ of provisions** ərzaqla təmin etmək üçün kontrakt /müqavilə bağlamaq; 4. müvəqqəti olaraq vəzifə tutma *(müəllim, keşiş və s. vəzifələri)*; 5. təklif; **~ and demand** təklif və tələb; *If demand exceeds supply, the price*

*will rise Əgər tələb təklifdən artıq olsa, qiymət qalxacaq*

**supply²** [sə'plaɪ] *adj* təminat, təchizat; ~ **base** təminat/təchizat bazası; ~ **centre** təminat/təchizat mərkəzi

**supply³** [sə'plaɪ] *v* **1.** **(with)** təchiz/təmin etmək *(bir şeylə)*; **to ~ smb. with smth.** bir kəsi bir şeylə təmin etmək; **to ~ smb. with food** bir kəsi ərzaqla təmin etmək; **2.** göndərmək, vermək, gətirmək; **to ~ smth.** bir şey göndərmək; **to ~ proofs** sübut vermək, dəlil gətirmək; **3.** razı salmaq/etmək; **4.** müvəqqəti əvəz etmək *(bir kəsi xüs. müəllimi)*

**support¹** [sə'pɔ:t] *n* **1.** kömək, kömək etmə, müdafiə, müdafiə etmə; **unanimous ~** yekdil/kömək/kömək etmə; **to give /to lend ~ to smb.** bir kəsə kömək etmək; **to get/to obtain ~** kömək almaq; **to get no ~** heç bir kömək almamaq; **to require ~** kömək istəmək, xahiş etmək; *I hope to have your support Mən ümid edirəm ki, sən/siz mənə kömək edəcəksən/edəcəksiniz. Mən sənin/sizin köməyinə/ köməyinizə ümid edirəm*; **2.** dayaq; arxa; *The elder son is the support of the family Böyük oğul ailənin dayağıdır*; **3.** ailə başçısı, ailəni dolandıran; *He was the support of the family O, ailənin başçısı idi*; **4.** *id.* dayaq

**support²** [sə'pɔ:t] *v* **1.** kömək/müdafiə etmək; tərəfdar olmaq, tərəfini saxlamaq, dəstəkləmək; **to ~ a political party** siyasi partiyanı müdafiə etmək; **to ~ peace policy** sülh siyasətini müdafiə etmək; **to ~ a reform** islahata tərəfdar çıxmaq/kömək etmək; *Which football team do you support? Sən/Siz hansı futbol komandasının tərəfini saxlayırsan?/ saxlayırsınız?*; **2.** kömək etmək *(maddi cəhətdən)*, saxlamaq *(ailəni və s.)*; **to ~ a family** ailəni saxlamaq; **to ~ a hospital** xəstəxanaya kömək etmək/ianə vermək; **3.** təsdiq etmək; *These facts support my theory Bu faktlar/dəlillər mənim nəzəriyyəmi təsdiq edir*; **4.** dözmək, tab gətirmək; *He can't support insolence O, sırıqlığa /ədəbsizliyə dözə bilmir*

**supporter** [sə'pɔ:tə^r] *n* tərəfdar; **a football ~** futbol tərəfdarı; **a ~ of the Prime Minister** baş nazirin tərəfdarı

**supporting** [sə'pɔ:tɪŋ] *adj* **1.** müdafiəçi, müdafiə edən; dəstəkləyən; dayaq; **a ~ point** dayaq nöqtəsi; **2.** *teatr.* köməkçi; **a ~ player/actor** köməkçi heyətin oyunçusu/ aktyoru

**suppose** [sə'pouz] *v* **1.** güman/zənn/ fərz/hesab etmək; *I suppose that he will come by the night train Mən güman edirəm ki, o, gecə qatarı ilə gələcək; He's right, I suppose Mən hesab edirəm ki, o, haqlıdır; I don't suppose she'll be there Mən güman etmirəm ki, o orada olacaq; Let us suppose that he is right Fərz edək ki, o, haqlıdır; Suppose A equals B Fərz edək ki, A bərabərdir B-yə*; **2.** tələb etmək; *This kind of work supposes great skill Bu növ işi görmək böyük sənətkarlıq/bacarıq/ustalıq tələb edir*

**supposed** [sə'pouzd] *adj* **1.** saxta, uydurma, yalançı; **her ~ brother** onun uydurma qardaşı; *The supposed beggar was really a policeman in disguise Uydurma dilənçi əslində qiyafəsini /görkəmini dəyişmiş polis idi*; **2.** təxmin/güman/ehtimal/fərz edilən, nəzərdə tutulan; **the ~ change** təxmin edilən dəyişiklik; *Her supposed wealth is a very small sum Onun təxmin edilən varı/dövləti çox kiçik bir məbləğdir*

**supposing** [sə'pouzɪŋ] *conj* əgər..., fərz edək ki..., tutaq ki...; *Supposing it will rain what shall we do? Fərz edək ki, yağış yağacaq, biz nə edəcəyik?*

**supposition** [ˌsʌpə'zɪʃn] *n* güman, fərziyyə, ehtimal; *It was a mere supposition O sadəcə olaraq fərziyyə/güman idi*

**suppositional** [ˌsʌpə'zɪʃənl] *adj* **1.** fərz/güman/ehtimal olunan, təxmini, təqribi; **2.** *dilç.* güman; ~ **mood** felin güman şəkli

**suppress** [sə'pres] *v* **1.** yatırmaq *(üsyanı və s.)*; **to ~ a revolt** qiyamı/üsyanı yatırmaq; **2.** dayandırmaq, qarşısını almaq; saxlamaq; gizlətmək; **to ~ anger** acığı/hirsi/qəzəbi gizlətmək; **to ~ tears** göz yaşlarını saxlamaq; **to ~ a yawn** əsnəmənin qarşısını almaq; *He couldn't suppress his feelings O, hisslərini gizlədə bilmədi*; **3.** bağlamaq, qapamaq, qadağan etmək *(qəzeti və s.)*; **to ~ publication** nəşri qadağan etmək

**suppressed** [sə'prest] *adj* **1.** yatırılmış, boğulmuş; **~ revolt** yatırılmış/boğulmuş qiyam; **2.** gizlədilmiş, qarşısı alınmış; **~ anger** gizlədilmiş qəzəb/acıq; **3.** boğuq; **~ groan** boğuq inilti; **in a ~ voice** boğuq səslə; **4.** qadağan edilmiş, qapanmış; **~ publication** qadağan edilmiş nəşr

**suppression** [sə'preʃn] *n* **1.** yatırma, boğma; **the ~ of a revolt** qiyamın yatırılması; **2.** gizlətmə, qarşısını alma; **the ~ of *one's* anger** qeyzin/acığın gizlədilməsi; **3.** qapanma, bağlanma, qadağan etmə; **the ~ of a newspaper** qəzetin qapanması/bağlanması

**suppurate** ['sʌpjureɪt] *v tib.* irinləmək, irin vermək, çirk gəlmək

**suppuration** [ˌsʌpju'reɪʃn] *n tib.* irinləmə, çirk eləmə, irin axma

**suppurative** ['sʌpjurətɪv] *adj tib.* irinli; **~ wound** irinli yara

**supremacy** [su:'preməsɪ, sju:-] *n* üstünlük; **the ~ of the state** dövlətin üstünlüyü; **to gain ~ over others** başqaları qarşısında/üzərində üstünlük qazanmaq; **military ~** hərbi üstünlük; **to achieve military ~ over neighbouring countries** qonşu ölkələr üzərində hərbi üstünlüyə nail olmaq

**supreme** [su:'prɪm, sju:-] *adj* **1.** ali; **Supreme Court** Ali Məhkəmə; **the ~ ruler of a vast empire** geniş imperiyanın ali hökmdarı; **the Supreme Being** Allah; **2.** baş; **the ~ commander of NATO** NATO-nun baş komandanı; **3.** ən böyük/yüksək; **~ happiness** ən yüksək xoşbəxtlik; **4.** ən vacib, son, axırıncı; **~ test** son test; **at the ~ moment** son anda



**supremely** [su:'pri:mlɪ] *adj* ali dərəcədə, son dərəcə; **~ happy** son dərəcə xoşbəxt

**sure¹** [ʃuə^r] *adj* (-r, -st) **1.** əmin, arxayın, xatircəm; **to be ~ of victory** qələbəyə əmin olmaq; **to be ~ of oneself** özünə əmin olmaq; *I'm sure that he is right Mən əminəm ki, o, haqlıdır*; **2.** şübhəsiz; *One thing is sure Bir məsələ/şey şübhəsizdir; He is sure to come O şübhəsiz gələcək*; **3.** etibarlı, möhkəm; **~ proof** etibarlı sübut; **~ remedy** etibarlı vasitə; *Put it in a sure place Onu etibarlı yerə qoy/qoyun*;
◊ **~ thing** şübhəsiz, əlbəttə; *Will he go with us? – Sure thing O bizimlə gedəcəkmi? – Əlbəttə!*; **to be ~** əlbəttə, şübhəsiz; *To be sure, she is beautiful Əlbəttə/Şübhəsiz o, gözəldir*; **to make ~ of/that** əmin olmaq; *I made sure (that) he would be there Mən əmin idim ki, o orada olacaq*; **for ~** şübhəsiz; *I'll do it for sure Mən onu şübhəsiz edəcəm*

**sure²** [ʃuə^r] *adv* əlbəttə, şübhəsiz; *Do you want a game of tennis? Sure! Bir əl tennis oynamaq istəyirsənmi?/istəyirsinizmi? Əlbəttə!; Sure enough Həqiqətən də; I said it would rain, and sure enough it did Mən dedim ki, yağış yağacaq, həqiqətən də yağdı*

**surely** ['ʃuəlɪ] *adv* **1.** əlbəttə, şübhəsiz, hökmən, mütləq; *He will surely come O hökmən/mütləq gələcək; Surely you know her Şübhəsiz sən/siz onu tanıyırsan/tanıyırsınız*; **2.** möhkəm, qəti, doğru; sədaqətlə, etibarla; **to know full ~** qəti/möhkəm bilmək; *Slowly but surely Yavaş-yavaş, lakin qəti*

**sureness** ['ʃuənɪs] *n* yəqinlik, əminlik, şübhəsizlik, möhkəmlik, qətilik, xatırcəmlik

**surface¹** ['sə:fɪs] *n* **1.** səth; **smooth/uneven/concave ~** hamar/kələ-kötür/sökük səth; **the earth's/the moon's ~** yerin/ayın səthi; **the polished ~ of a diamond** brilyantın cilalanmış səthi; **2.** xaric, zahir, xarici görünüş; **on the ~** xaricən, zahirən; *His politeness is only on the surface Onun nəzakəti ancaq zahiridir*; **3.** üz; *Doubts began to rise to the surface Şübhələr üzə çıxmağa başladı*

**surface²** ['sə:fɪs] *adj* xarici, zahiri; **~ politeness** xarici/zahiri nəzakət; **a ~ wound** xarici yara

**surface³** ['sə:fɪs] *v* **1.** işləyib səthi düzəltmək/ qaydaya/ istənilən şəklə salmaq; **2.** suyun üzünə çıxmaq/ çıxartmaq *(sualtı qayıq haq.)*

**surface tension** ['sə:fɪsˌtenʃn] *n fiz.* səthi gərginlik/ dartılma

**surfeit¹** ['sə:fɪt] *n* **1.** hədsiz-hesabsızlıq, hədd-hüdudu bilməmə *(xüs. yeməkdə və içməkdə)*; **a ~ of wine** şərabdan həddən artıq istifadə etmə; **2.** artıq, artıqlıq, bolluq; **a ~ of complaints** nəhayətsiz şikayətlər; **3.** həddən artıq doyma, ürəyi bulanma; **to eat to a ~** həddən artıq /ürəyi bulanana qədər yemək

**surfeit²** ['sə:fɪt] *v* **1.** çox/həddən/qədərindən artıq yemək; **2.** həddən/qədərindən artıq yedirtmək; **3.** *(adət. məchulda)* çiyrindirmək, ürəyini vurmaq; təngə gətirmək, bıqdırmaq, cana gətirmək; **to be ~ed with *smth.*** bir şeydən təngə/cana gəlmək; *He was surfeited with pleasure O, əyləncədən təngə/cana gəlmişdi*

**surge¹** [sə:dʒ] *n* **1.** dalğa; **the ~ of the sea** dənizin dalğası; **a ~ of anger** qəzəb dalğası; **2.** xırda/xəfif/kiçik ləpə; **3.** *şair.* dəniz; **4.** kəskin sıçrayış; **5.** atmosfer təzyiqinin dəyişməsi

**surge²** [sə:dʒ] *v* **1.** qabarmaq, qalxıb düşmək *(dalğa haq.)*; *The waves of the sea surged Dənizin dalğaları qalxıb düşdü; The waves surged higher and higher Dalğalar daha yüksəklərə qalxırdı*; **2.** vurmaq; *The blood surged to her cheeks Qan onun yanaqlarına vurdu*; **3.** artmaq, şiddətlənmək, coşmaq *(səs, hiss və s.; həm də* **to ~ up**); *Anger surged (up) within her Onun içində qəzəb coşdu*

**surgeon** ['sə:dʒən] *n* **1.** cərrah; **a heart ~** ürək cərrahı; **2.** ordu və ya dəniz donanması həkimi

**surgery** ['sə:dʒərɪ] *n* cərrahlıq; **cosmetic ~** kosmetik cərrahlıq/cərrahiyyə; **plastic ~** plastik cərrahlıq/ cərrahiyyə; **clinical ~** klinik cərrahiyyə; *Many lives have been saved by surgery Cərrahlıq çox həyatları xilas edib*

**surgical** ['sə:dʒɪkl] *adj* cərrahlıq; **~ instruments** cərrahlıq alətləri; **~ gauze** cərrahlıq üçün tənzif

**surgically** ['sə:dʒɪklɪ] *adv* cərrahiyyə yolu/üsulu ilə; *The tumor was surgically removed Şiş cərrahiyyə yolu ilə kəsilib çıxarıldı*

**surly** ['sə:lɪ] *adj* ( -ier, -iest) **1.** üzügülməz, qaşqabaqlı, qaraqabaq; acıqlı, hirsli; kobud, deyingən; **a ~ child** qaraqabaq/qaşqabaqlı uşaq; **~ answer** kobud cavab; **2.** kəskin, sərt; tutqun; **~ season** ilin sərt fəsli

**surmise¹** ['sə:maɪz] *n* güman, təxmin, ehtimal, fərz; şübhə; **to be right in *one's* ~s** təxminləri/gümanları doğru çıxmaq; *It's a mere surmise Bu sadəcə olaraq gümandır/ehtimaldır*

**surmise²** [sə:maɪz] *v* təxmin/güman/fərz/ehtimal/zənn etmək; fikrində olmaq; şübhələnmək; *I surmised as much Mən elə belə də güman/zənn edirdim*

**surmount** [sə'maunt] *v* **1.** öhdəsindən gəlmək, aradan qaldırmaq; **to ~ difficulties** çətinliklərin öhdəsindən gəlmək, çətinlikləri aradan qaldırmaq; **2.** aşmaq *(dağı)*, keçmək; **to ~ an obstacle** manеəni aşmaq; **to ~ the ridge** alçaq sıra dağları aşmaq

**surmountable** [sə'mauntəbl] *adj* öhdəsindən gəlinə bilən, aradan qaldırılması mümkün olan; dəf edilə bilən

**surname** ['sə:neım] *n* soyad; *Smith is a common English surname Smit çox/geniş yayılmış ingilis soyadıdır*

**surpass** [sə:'pa:s] *v* **1.** ötüb keçmək, üstün gəlmək, geridə qoymaq/buraxmaq; **to ~ *smb.* in *smth.*** bir kəsi bir şeydə ötüb keçmək; **to ~ *smb.* in kindness** mərhəmətdə bir kəsi geridə buraxmaq; **2.** ötmək; **to overtake and ~** çatmaq və ötmək

**surpassing** [sə:'pa:sıŋ] *adj* çox yaxşı/gözəl/ qəşəng, əla; misilsiz, tayı-bərabəri olmayan; **of ~ beauty** misilsiz gözəllik

**surpassingly** [sə:'pa:sıŋlı] *adv* çox gözəl/yaxşı, mükəmməl; son dərəcə; **to speak English ~** ingiliscə çox yaxşı/mükəmməl danışmaq

**surplus**[1] ['sə:pləs] *n* artıq, artıqlıq; qalıq; **a big ~ of coffee** kofenin çox böyük artıqlığı; **a ~ in teachers** müəllim hazırlığında artıqlıq

**surplus**[2] ['sə:pləs] *adj* artıq, artıq qalan, bol; **~ commodities** əmtəə artıqlığı; **~ population** əhali artıqlığı

**surprise**[1] [sə'praız] *n* **1.** təəccüb, heyrət; **in ~** təəccüblə, heyrətlə; *She looked up in surprise when I entered the room Mən otağa daxil olanda, o təəccüblə baxdı*; **to show ~** təəccüblənmək, heyrətlənmək; **to cause ~** təəccüb/heyrət yaratmaq, təəccübləndirmək, heyrətləndirmək; **2.** sürpriz, gözlənilməzlik; *It was a great surprise to me Bu mənim üçün böyük sürpriz idi/oldu*

**surprise**[2] [sə'praız] *v* **1.** təəccübləndirmək, heyrətləndirmək, heyrətə salmaq; *He surprised me O məni təəccübləndirdi*; **to be ~d at *smb.*/at *smth.*** bir kəsə/bir şeyə təəccüblənmək; **2.** qəfildən/ gözlənilmədən gəlmək; qəfildən/ gözlənilmədən hücum etmək; qəfildən/ gözlənilmədən basqın etmək; qəfildən tökülüşüb gəlmək; üstünə çıxmaq *(qəfildən)*

**surprising** [sə'praızıŋ] *adj* təəccüblü, heyrətləndirici; gözlənilməz, gözlənilməyən; **a ~ news** təəccüblü/ gözlənilməz xəbər; **a ~ result** təəccüblü/gözlənilməz nəticə

**surprisingly** [sə'praızıŋlı] *adv* təəccüblü; olduqca, çox, təəccübə səbəb olacaq dərəcədə; *She has changed surprisingly O olduqca /çox dəyişib*

**surrender**[1] [sə'rendə^r] *n* **1.** təslim olma, təslim; kapitulyasiya; **~ at discretion** *harb.* qeyd-şərtsiz/ danışıqsız təslim olma; **to sign a treaty of ~** təslim olma haqqında müqaviləyə imza atmaq/qol çəkmək; **2.** imtina etmə, əl çəkmə *(bir şeydən)*; **to make ~ of *one's* principles** prinsiplərindən imtina etmək/əl çəkmək

**surrender**[2] [sə'rendə^r] *v* **1.** təslim etmək; **to ~ a town to the enemy** şəhəri düşmənə təslim etmək; **2.** təslim olmaq; **to ~ to the police** polisə təslim olmaq; *The criminal finally surrendered to the police Cinayətkar nəhayətdə/sonda polisə təslim oldu*; **3.** əl çəkmək/götürmək; imtina etmək; **to ~ hope** ümiddən əl çəkmək; **to ~ *one's* right to *smb.*** bir kəsin xeyrinə öz hüququndan əl çəkmək/imtina etmək; *We'll surrender our liberty to no one Biz öz azadlığımızdan heç kəsin xeyrinə əl çəkməyəcəyik*; **4.** qapılmaq, düşmək; **to ~ to despair** ümidsizliyə qapılmaq/ düşmək

**surreptitious** [,sʌrəp'tıʃəs] *adj* gizli, oğrun; **~ look** gizli/oğrun baxış

**surreptitiously** [,sʌrəp'tıʃəslı] *adv* gizlincə, oğrunca, xəlvəti, əl altından; **to look at *smb.* ~** bir kəsə oğrunca/xəlvəti/gizlincə baxmaq

**surrogate** ['sʌrəgət] *n* **1.** müavin *(xüs. yepiskopun və s.)*; **2.** əvəzedici, əvəz edən şey; surroqat

**surround**[1] [sə'raund] *n* **1.** çərçivələmə; çərçivə, haşiyə; haşiyələmə; kənar, köbə, bordyur; **~ of a carpet** xalçanın haşiyəsi/yeləni/kənarı; **2.** dövrələmə, dövrəyə/mühasirəyə alma, mühasirə

**surround**[2] [sə'raund] *v* **1.** əhatəyə almaq; **to ~ a town with walls** şəhəri divarla əhatəyə almaq; *The house is surrounded by/with a fence Ev hasarla dövrələnib, Evin ətrafına hasar çəkilib*; **2.** mühasirəyə /əhatəyə almaq; *They were surrounded by the enemy Düşmən onları mühasirəyə/əhatəyə aldı*

**survey**[1] ['sə:veı] *n* **1.** gözdən keçirmə, araşdırma; baxma; **a moment's ~ of her face** onun üzünə bir anlıq baxma; **2.** xülasə; **historical /political ~** tarixi/siyasi xülasə; **a ~ of modern literature** müasir ədəbiyyatın xülasəsi; **3.** təhlil, təhlil etmə; **annual ~** illik təhlil

**survey**[2] ['sə:veı] *v* **1.** nəzərdən keçirmək, seyr etmək, baxmaq; **to ~ the crowd from the balcony** balkondan izdihamı seyr etmək, balkondan izdihama baxmaq; *He carefully surveyed the valley O, dərəyə diqqətlə baxdı, O, dərəni diqqətlə nəzərdən keçirdi*; **2.** gözdən keçirmək, tanış olmaq, tədqiq etmək, öyrənmək; **to ~ the situation** vəziyyəti öyrənmək, vəziyyətlə tanış olmaq; **3.** yoxlamaq, təftiş etmək; **to ~ a school** məktəbi yoxlamaq; *The committee surveyed our school Komitə bizim məktəbi yoxladı/təftiş etdi*; **4.** xülasə vermək; *In his speech he surveyed the international situation Öz nitqində o, beynəlxalq vəziyyətin xülasəsini verdi*

**surveyor** [sə'veıə^r] *n* **1.** yerölçən *(mütəxəssis)*; topoqraf *(topoqrafiya mütəxəssisi)*; geodezist *(geodeziya mütəxəssisi)*; markşeydr *(mədənlərin geodezik planını almaqla məşğul olan mütəxəssis)*; **2.** nəzarətçi, müfəttiş; **~ of weights and measures** çəkilərin və ölçülərin nəzarətçisi



**survival** [sə'vaıvl] *n* **1.** sağ qalma, ölməmə; **the ~ of some people in the air crash** təyyarə qəzasında bir neçə adamın sağ qalması; **2.** qalıq; **a ~ of times past** keçmiş zamanın/vaxtın qalığı; *This ceremony is a survival from pre-Christian times Bu mərasim xristianlıqdan əvvəlin qalığıdır*

**survive** [sə'vaıv] *v* **1.** çox/artıq yaşamaq *(müasirlərindən, arvadından və s.)*; **to ~ *one's* wife/ *one's* husband/*one's* children** arvadından/ ərindən/ uşaqlarından çox/artıq yaşamaq; **2.** sağ qalmaq; **to ~ an injury/a disease** yaralanmadan/xəstəlikdən ölməyib sağ qalmaq; *He was the only one to survive the fire Yanğından sağ qalan ancaq o idi, Yanğından ancaq o, sağ çıxdı*; **3.** qalmaq; *This fact survived in my memory Bu fakt mənim xatirimdə/yaddaşımda qaldı*; **4.** yaşamaqda davam etmək, yaşamaq; *Some old customs still survive Bəzi qədim adətlər hələ də yaşayır/yaşamaqda davam edir*

**survivor** [sə'vaıvə^r] *n* **1.** sağ qalan; *There was only one survivor Ancaq bir nəfər sağ qaldı*; **2.** *hüq.* sağ qalan yeganə varis/vərəsə

**susceptibility** [sə,septə'bılıtı] *n* **1.** meyl, meyllilik; **~ to a disease** xəstəliyə meyl; **2.** həssaslıq, tez mütəəssir olma/ təsirlənmə; **~ to pain** ağrıya həssaslıq; **3.** küsəyənlik, tez küsmə/incimə /sınma

**susceptible** [sə'septəbl] *adj* **1.** meylli; **to be ~ to disease** xəstəliyə meylli olmaq; **to be ~ to flattery** yaltaqlığa meylli olmaq; *Children are more susceptible to some diseases than adults Uşaqlar bəzi xəstəliklərə böyüklərdən daha meyllidirlər*; **2.** çox tez təsirlənən/mütəəssir olan; nazikürəkli, incəqəlbli; **a ~ young man 1)** nazikürəkli gənc oğlan; **2)** tez vurulan/bənd olan/aşiq olan gənc oğlan; **3. (to)** həssas; **~ to cold** soyuğa həssas *(yəni tez soyuq dəyən)*; **4. (to)** mümkün olan, yol verən; **facts not ~ of proof** sübut edilə bilməyən/sübutu mümkün olmayan faktlar

**suspect**[1] ['sʌspekt] *n* şübhəli/etibarsız adam; **political ~s** siyasi şübhəli adamlar

**suspect**[2] ['sʌspekt] *adj* şübhəli, etibarsız; *His reasoning is suspect Onun dəlilləri şübhəlidir; The car has a suspect tyre Maşının təkərlərindən biri etibarsızdır*

**suspect**[3] [sə'spekt] *v (Davamedici zaman formalarında işlənmir)* **1.** təxmin/güman/fərz/ehtimal/zənn etmək, qabaqcadan hiss etmək/duymaq, ürəyinə dammaq; **to ~ a plot** sui-qəsdin olduğunu zənn/təxmin etmək/ duymaq; **2.** şübhələnmək; **to ~ *smb.* of murder/of treachery** satqınlıqda/ölümdə bir kəsdən şübhələnmək; *Whom do you suspect? Sən/Siz kimdən şübhələnirsən? /şübhələnirsiniz?*

**suspend** [səs'pend] *v* **1.** asmaq; **to ~ a lamp from the ceiling** tavandan lampa asmaq; *The lamp was suspended from the ceiling Lampa tavandan asılmışdı*; **2.** dayandırmaq, ləğv etmək *(müvəqqəti olaraq)*; **to ~ work** işi (müvəqqəti olaraq) dayandırmaq; **to ~ a discussion** müzakirəni (müvəqqəti olaraq) dayandırmaq; **to ~ a rule** qaydanı müvəqqəti olaraq ləğv etmək; **3.** müvəqqəti olaraq kənarlaşdırmaq/ çıxartmaq; **to ~ a teacher** müəllimi müvəqqəti olaraq işdən çıxartmaq/ kənarlaşdırmaq; **4.** *id.* oyunçunu müvəqqəti olaraq meydandan çıxartmaq

**suspended** [səs'pendıd] *adj* **1.** asılmış; asılı, asma; **a ~ lamp** asılmış lampa; **~ railway** asma dəmir yolu; **2.** dayandırılmış, təxirə salınmış; **~ payment** dayandırılmış əməkhaqqı/maaş

**suspender** [səs'pendə^r] *n* corabbağı, dizbağı

**suspense** [səs'pens] *n* **1.** narahatçılıq, əndişə, həyəcan, təlaş, təşviş, nigarançılıq; **to keep *smb.* in ~** bir kəsi nigarançılıqda/təşviş içərisində saxlamaq; *We waited with great suspense for the doctor's opinion Biz həkimin fikrini/rəyini çox böyük təlaş/təşviş içərisində gözlədik*; **2.** qeyri-müəyyənlik; *Our plan was still in suspense Bizim planımız hələ də qeyri-müəyyən idi*

**suspension** [səs'penʃn] *n* **1.** dayandırma, müvəqqəti olaraq saxlama; **~ of arms/of hostilities** *hərb.* hərbi əməliyyatı müvəqqəti olaraq dayandırmaq; **~ of nuclear test** atom silahı sınağının müvəqqəti olaraq dayandırılması; **2.** *id.* oyunun müvəqqəti dayandırılması; **3.** müvəqqəti olaraq vəzifədən kənarlaşdırma; **4.** müflisləşmə; ödəmənin müvəqqəti dayandırılması

**suspension-bridge** [səs'penʃənbrıdʒ] *n* asma körpü

**suspensive** [səs'pensıv] *adj* **1.** müvəqqəti; **~ veto** müvəqqəti veto; **2.** qətiyyətsiz, səbatsız, qərarsız; aciz, cəsarətsiz

**suspicion** [səs'pıʃn] *n* şübhə; **on ~** şübhəyə görə; **to arrest *smb.* on ~** bir kəsi şübhəyə görə həbs etmək; **to be under ~** şübhə altında olmaq, şübhəli bilinmək; *He looked at me with suspicion O mənə şübhə ilə baxdı*; **to have ~ about *smb.*/*smth.*** bir kəsdən/bir şeydən şübhələnmək; *I have a suspicion about this Mənim buna şübhəm var*

**suspicious** [səs'pıʃəs] *adj* **1.** şübhəli, etibarsız; **to be ~ of/about *smb.*** bir kəsdən şübhələnmək, bir kəsə etibar etməmək; **to become ~** şübhələnmək; *I became suspicious as soon as I saw him there Mən onu orada görən kimi şübhələndim*; **2.** şübhə/etibarsızlıq yaradan; **a ~ person** şübhə yaradan adam

**suspiciously** [səs'pıʃəslı] *adv* şübhə ilə, şübhəli; **to eye *smb.* ~** bir kəsə şübhə ilə baxmaq

**suspiciousness** [səs'pıʃəsnıs] *n* şübhəlilik

**sustain** [səs'teın] *n* **1.** dayaq vermək/vurmaq, dayaq vurub saxlamaq; saxlamaq; *The beams sus-*

*tain the ceiling Tirlər tavanı saxlayır*; 2. kömək etmək, möhkəmləndirmək; **to ~ *smb.'s* hopes** bir kəsin ümidlərinin doğrulmasına kömək etmək, bir kəsin ümidlərinin sönməsinə imkan verməmək; *Food sustains life Yemək həyatı davam etdirir*; **to ~ a conversation** söhbəti davam etdirmək; **to ~ a siege** mühasirəyə tab gətirmək; *The ice will not sustain your weight Buz sənin/sizin ağırlığına/ağırlığınıza tab gətirməyəcək/dözməyəcək*; 3. tərəfdar çıxmaq, müdafiə etmək; **to ~ a claim** tələbi müdafiə etmək; 4. təsdiq etmək, əsaslandırmaq *(nəzəriyyəni, iddianı və s.)*

**sustained** [səs'teınd] *adj* aramsız, uzunmüddətli, davamlı; ~ **efforts** aramsız səylər; ~ **fire** *hərb.* davamlı/aramsız atəş; ~ **defence** uzunmüddətli müdafiə; ~ **offensive** *hərb.* aramsız /uzunmüddətli hücum

**sustenance** ['sʌstənəns] *n* 1. yaşayış vasitələri; 2. qida, yeyəcək, qida məhsulları, azuqə; *He lived a week without sustenance O bir həftə qidasız/yeyəcəksiz yaşadı*; 3. qidalılıq

**swab**[1] [swɔb] *n* 1. lif süpürgə; döşəmə taxtası; 2. *tib.* tampon, piltə *(yaraya qoymaq üçün)*

**swab**[2] [swɔb] *v* 1. lif süpürgə ilə/pol taxtası ilə yumaq; 2. silmək, silib təmizləmək *(həm də* **to ~ up**); **to ~ the wound with cotton wool** yaranı sterilizə edilmiş pambıqla silmək; **to ~ the blood off *smb.'s* face** bir kəsin üzündən qanı silmək

**swaddle**[1] ['swɔdl] *n* qundaq, bələk, əsgi

**swaddle**[2] ['swɔdl] *v* 1. bələmək, qundaqlamaq *(uşağı)*; 2. bürünmək, büründürmək

**swaddling-clothes** ['swɔdlıŋklouðz] *n pl* bələk, qundaq; bələkbağı, qundaqbağı

**swag** [swæg] *n* 1. *d.d.* oğurlanmış şey/mal; qənimət; 2. *d.d.* rüşvət, əyri yolla alınmış pul/para

**swagger**[1] ['swægəʳ] *n* 1. lovğa/təkəbbürlü/iddialı hərəkət/ duruş/ yeriş və s., **to walk with a ~** lovğa-lovğa/ təkəbbürlə yerimək/gəzişmək; 2. həddən artıq sərbəstlik/ sırtıqlıq/ həyasızlıq/ ədəbsizlik

**swagger**[2] ['swægəʳ] *adj d.d.* çox gözəl/qəşəng/ yaxşı, çox şıq/yaraşıqlı/bahalı; **a ~ coat** çox şıq/bahalı palto

**swagger**[3] ['swægəʳ] *v* 1. lovğa-lovğa/təkəbbürlü tərzdə gəzişmək *(həm də* **to ~ about/in/ out**); iddia satmaq, təkəbbürlənmək, lovğalanmaq; 2. **(about)** özünü öymək/tərifləmək

**swaggeringly** ['swægərıŋlı] *adv* təkəbbürlə, lovğa-lovğa; özünü öyə-öyə

**swallow**[1] ['swɔlou] *n* I 1. udum, qurtum, içim; bir udum/qurtum/içim; **at a ~** bir qurtumda; **to take a ~ of water** bir qurtum su içmək; 2. udma

**swallow** ['swɔlou] *n* II *zool.* qaranquş;

◊ *One swallow doesn't make a summer at. söz. ≅ Bir çiçəklə/güllə yaz olmaz*

**swallow**[2] ['swɔlou] *v* 1. udmaq *(həm də* **to ~ up**); **to ~ at one gulp** bir dəfəyə udmaq; **to ~ a pill** həb udmaq; 2. dözmək, udmaq *(təhqiri və s.)*; **to ~ an insult** təhqirə dözmək, təhqiri udmaq; 3. basmaq *(hirsi və s.)*; **to ~ *one's* anger** hirsini basmaq; 4. inanmaq; *He will swallow anything you tell him Sən/Siz nə danışsan/danışsanız, o hər şeyə inanacaq*;

◊ **to ~ the bait** aldanmaq, tora düşmək; **to ~ *one's* words** sözünü yemək/geri götürmək

**swam** [swæm] **to swim** *felinin pt forması*

**swamp**[1] [swɔmp] *n* bataqlıq, bataq yer

**swamp**[2] [swɔmp] *v* 1. basmaq *(su haq.)*; *A big wave swamped the boat Böyük dalğa qayığı basdı*; 2. batmaq; *The boat swamped and was lost Qayıq su ilə doldu və batdı*; 3. yağdırmaq; *They swamped him with questions Onlar onun üstünə sual yağdırdılar*

**swampy** ['swɔmpı] *adj* batlaq, bataqlıq; ~ **terrain** batlaq/bataqlıq yer

**swan** [swɔn] *n zool.* qu *(quş)*; **white ~** ağ qu; **black ~** qara qu;

◊ *All his geese are swans O hər şeyi şişirdir; ≅ Hamının qarğası özünə qırğıdır*

**swank**[1] [swæŋk] *n d.d.* 1. lovğalıq, gopçuluq, özünü öymə; təkəbbür; 2. lovğa/gopçu/təkəbbürlü adam

**swank**[2] [swæŋk] *adj* 1. lovğa, özünü öyən, gopçu; təkəbbürlü; *Don't be such a swank! Belə lovğa olma/olmayın*; 2. şıq, çox qəşəng/gözəl/bahalı

**swank**[3] [swæŋk] *v d.d.* 1. lovğalanmaq, gop etmək /eləmək, özünü öymək, təkəbbürlənmək, iddia satmaq; 2. şıq/qəşəng geyinmək, qəşəng geyinib gəzmək/fors etmək

**swanky** ['swæŋkı] *adj* (**-ier, -iest**) 1. bahalı, cahcalallı, dəbdəbəli; **a ~ hotel** bahalı/dəbdəbəli mehmanxana; *He always stays in a swanky hotel O həmişə dəbdəbəli/ bahalı mehmanxanada qalır*; 2. lovğa, təkəbbürlü, iddialı, özünü öyən; **Tom and his ~ friends** Tom və onun lovğa/təkəbbürlü dostları

**swap**[1] [swɔp] *n* dəyişmə, dəyişdirmə; mübadilə

**swap**[2] [swɔp] *v* **(-pp-)** 1. dəyişmək, dəyişdirmək, mübadilə etmək; **to ~ watches** saatları dəyişmək/ dəyişdirmək; 2. sövdələşmək

**swarm**[1] [swɔ:m] *n* 1. dəstə, izdiham, camaat; **~s of people** insan dəstələri; **in ~** dəstə ilə, dəstə-dəstə; 2. *k.t.* arı dəstəsi/beçəsi; 3. yığın, sürü; **a ~ of bees/ ants/starlings/locusts** bir sürü arı/qarışqa/ sığırçın/ çəyirtkə

**swarm**[2] [swɔ:m] *v* 1. yığışmaq, toplaşmaq, doluşmaq; *People swarmed into the cinema Adamlar kino-teatra doluşdular*; 2. **(with)** çox/bol/dolu olmaq; *The house is swarmed with insects Ev həşəratla doludur*; 3. törəmək, artmaq *(bal arısı haq.)*

**swarming** ['swɔ:mıŋ] *n* beçələmə, beçə vermə *(bal arıları haq.)*



**swarthy** ['swɔ:ðı] *adj* qarabuğdayı, əsmər; **a ~ girl** qarabuğdayı/əsmər qız

**swastika** ['swɔstıkə] *n* svastika, faşistlərin rəmzi

**swathe**[1] [sweıð] *n* 1. bint; sarğı; 2. *tib.* bandaj

**swathe**[2] [sweıð] *v* 1. bintləmək, bintlə sarımaq; 2. bürümək, bələmək

**sway**[1] [sweı] *n* 1. yellənmə, yırğalanma; yelləmə, yırğalama, atıb-tutma; 2. hakimiyyət; ixtiyar, səlahiyyət; **to hold/to bear ~ over *smb.*** bir kəs üzərində hakimiyyəti olmaq; **to have great ~** böyük səlahiyyəti/ixtiyarı olmaq

**sway**[2] [sweı] *v* 1. yellənmək, yırğalanmaq; səndələmək, valaylamaq; **to ~ to and from** o yana bu yana yellənmək/səndələmək; *The branches were swaying in the wind Budaqlar küləkdə yellənirdi; He swayed, as if about to fall O səndələdi, elə bil yıxılacaqdı*; 2. yellətmək, yırğalamaq; *The wind swayed the banners Külək bayraqları yellətdi*; 3. təsir etmək, təsiri olmaq *(bir kəsə, bir şeyə)*; *His speech swayed thousands of votes Onun nitqi minlərlə seçiciyə təsir etdi*

**swear**[1] [sweəʳ] *n* and, allaha and içmə

**swear**[2] [sweəʳ] *v* *(pt* **swore** [swɔ:ʳ]; *pp* **sworn** [swɔ:n]) 1. and içmək; **to ~ to do *smth.*** bir şeyi etməyə and içmək/təntənəli tərzdə söz vermək; *He swore that he would say nothing O and içdi ki, heç nə deməyəcək*; 2. and içməyə məcbur etmək; **to ~ *smb.* to secrecy** bir kəsi sirri saxlayacağına and içdirmək; 3. danlamaq, abırlamaq, abrını almaq, küfr danışmaq; *The foreman is always swearing at the workers Briqadir həmişə fəhlələri danlayır*; **to ~ off** *d.d.* and içməkdən imtina etmək/boyun qaçırmaq; **to ~ off drink** içməməyə and içmək/söz vermək, içməkdən tövbə etmək; *He swore off smoking O, papiros çəkməyi tövbə etdi*

**swear-word** ['sweəwə:d] *n* söyüş, danlaq

**sweat**[1] [swet] *n* 1. tər; **to break into a ~** tərləmək; *He is dripping with sweat Ondan tər axır*; **in a ~** tər içində; **to wipe the ~ from *one's* forehead** alnından təri silmək; 2. tərləmə; *A good sweat will cure your cold Yaxşı tərləmə səni/sizi soyuqdəymədən müalicə edəcək*; 3. ağır /üzücü iş; *I can't stand the sweat of it Mən bu üzücü işə dözə bilmirəm*

**sweat**[2] [swet] *v* 1. tərləmək; **to ~ with heat** istidən tərləmək; *His hands sweat Onun əlləri tərləyir; The window sweated Pəncərə tərlədi*; 2. tərdən islanmaq; *He sweated his shirt O, köynəyini tərdən islatdı*; 3. *d.d.* bərk/çox işləmək; **to ~ over a problem** problem üstündə çox/bərk işləmək; **to ~ out 1)** qurtulmaq, xilas olmaq; *He is sweating out of his cold O, soyuqlamadan xilas olmaq üçün özünü tərlətməyə çalışır*; 2) zorla/hədələməklə almaq, qoparmaq *(pul və s.)*; *I'll sweat the money out of him Mən bu pulu ondan qoparacam/çıxaracam*

**sweat-cloth** ['swetklɔθ] *n* tərlik, yəhəraltı

**sweater** ['swetəʳ] *n* 1. tərlədici vasitə; 2. sviter

**sweat-gland** ['swetglænd] *n anat.* tər vəzisi

**sweaty** ['swetı] *adj* (**-ier, -iest**) 1. tərli; **~ hands** tərli əllər; **a ~ shirt** tərli köynək; **~ clothes** tərli paltar; 2. tərlədən; **a hot ~ day** isti tərlədən gün; 3. ağır, çətin, ağır zəhmət tələb edən; **a ~ piece of work** çətin/ağır iş

**sweep**[1] [swi:p] *n* 1. süpürmə; **to give the room a good ~** otağı yaxşıca/yaxşı-yaxşı süpürmək; 2. bacatəmizləyən; 3. küçəsüpürən; 4. *d.d.* yaramaz, alçaq, əclaf *(adam)*; 5. süzmə; **to move with a ~** süzə-süzə/yüngül yerimək; 6. genişlik, açıqlıq, geniş sahə; **the ~ of vision** görünən açıqlıq/sahə; 7. görüş sahəsi/dairəsi; bilik səviyyəsi; **to bring *one's* arguments within ~ of *one's* audience** öz dəlillərini dinləyicisi üçün anlaşıqlı etmək; 8. uduş *(kart oyununda)*: **to make a clean ~** hamısını udmaq; 9. uzun avar/kürək;

◊ **at a/one ~** bir zərbədə, bir dəfəyə / dəfədə; **to make a clean ~ of *smth.*** bir şeydən yaxa qurtarmaq

**sweep**[2] [swi:p] *v* *(pt, pp* **swept** [swept]) 1. süpürmək, təmizləmək; **to ~ the floor** döşəməni süpürmək; **to ~ out the room** otağı süpürüb təmizləmək; **to ~ the chimneys** bacaları təmizləmək; **to ~ clean 1)** təmiz süpürmək; 2) *məc.* yeyib qurtarmaq *(nə varsa)*; **to ~ the table** stolda nə varsa hamısını yeyib qurtarmaq; 2. *hərb.* kəşfiyyat aparmaq; **to ~ the sea 1)** dənizdə kəşfiyyat aparmaq; **to ~ the sea for enemy ships** dənizdə düşmən gəmisi axtarmaq; 2) dənizi təmizləmək *(düşməndən)*; 3. yığmaq, toplamaq *(bir yerə)*; **to ~ up dead leaves** quru yarpaqları bir yerə yığmaq/toplamaq; **to ~ the litter into a corner** zibili süpürüb bir küncə yığmaq/toplamaq; 4. əzəmətlə/vüqarla yerimək; *The actress swept on to the stage Aktrisa əzəmətlə/vüqarla səhnədə göründü/ səhnəyə çıxdı*; 5. əhatə etmək, bürümək; **to ~ the country** ölkəni əhatə etmək/bürümək; *Fear swept over Europe Qorxu Avropanı bürüdü*; 6. uzanmaq; *The plain sweeps away to the sea Düzənlik dənizə qədər uzanır*; 7. yer süpürmək; *Her dress sweeps the ground Onun donu yer süpürür*; 8. tam qələbə qazanmaq/əldə etmək; **to ~ the election** seçkidə tam qələbə qazanmaq; **to ~ away 1)** süpürüb təmizləmək/atmaq; 2) məhv/ləğv etmək, aradan götürmək/qaldırmaq; **to ~ away slavery /feudalism** quldarlığı/feodalizmi ləğv etmək; **to ~ in 1)** soxulmaq; *The wind swept in Külək içəri soxuldu*; 2) vüqarla/əzəmətlə gəlmək; *She swept in O əzəmətlə içəri girdi*; 3) şaybanı diyirlədib salmaq *(hokkey oyununda)*

**sweeper** ['swi:pəʳ] *n* süpürgəçi; **a road ~** yol süpürən *(adam)*

**sweeping**¹ ['swi:pɪŋ] *n* süpürmə, təmizləmə, yığışdırma

**sweeping**² ['swi:pɪŋ] *adj* 1. geniş, böyük; radikal; ~ **changes** böyük/radikal dəyişikliklər; ~ **proposals on disarmament** tərk-silah haqqında radikal təkliflər; 2. əsassız, əsaslandırılmamış; ~ **accusations** əsassız ittihamlar

**sweepings** ['swi:pɪŋz] *n* 1. zibil, tullantı; 2. yaramaz adamlar, tör-töküntü *(cəmiyyətdə)*

**sweet**¹ [swi:t] *n* 1. nabat, konfet; **to like** ~ şirni/şirniyyat xoşlamaq; 2. istəkli, sevgili; canan; 3. *pl* sevinc, kef, ləzzət, nəşə; **the ~s of life** həyatın ləzzəti/nəşəsi/sevinci

**sweet**² [swi:t] *adj* (-er, -est) 1. şirin; ~ **apples** şirin alma; ~ **wine** şirin şərab/çaxır; **to taste** ~ şirin dadmaq; **to like** *one's* **tea** ~ şirin çay xoşlamaq; ~ **water** şirin su; ~ **butter** duzlanmamış kərə yağı; 2. ətirli, rayihəli; **to smell ~, to have a ~ smell** ətirli olmaq; 3. melodik, məlahətli, ahəngdar *(səs haq.)*; **a ~ voice** məlahətli/ahəngdar səs; 4. xoş, şirin; ~ **manner** xoş rəftar; ~ **sleep** şirin yuxu; 5. qanışirin, xoşsifət, qəşəng; **a ~ girl** qanışirin/xoşsifət/qəşəng qız; **a ~ little hat** balaca qəşəng şlyapa; 6. sevimli, əziz; *My sweet(est) one Mənim əzizim! (müraciət maqamında işlədilir)*; 7. münbit *(torpaq haq.)*;

◊ **to have a ~ tooth** şirinsevən/ şirniyyat sevən olmaq; **to be ~ on/upon** *smb.* bir kəsin sevimlisi/ sevgilici olmaq

**sweet cherry** ['swi:t'tʃerɪ] *n bot.* şirin gilas

**sweeten** ['swi:tən] *v* 1. şirinləşdirmək, şirin etmək/ eləmək; **to ~ tea with sugar** çayı şəkərlə/qəndlə şirin etmək; 2. şirniləşmək; *Fruit sweetens as it ripens Meyvə dəyəndə şirinləşir;* 3. ətirləndirmək, ətirlənmək; 4. təzələmək, təravətləndirmək; havasını dəyişmək/təmizləmək; 5. xoşahəng etmək, melodikləşdirmək, melodikləşmək, ahəngdar etmək/ olmaq; 6. yumşaltmaq, yumşalmaq

**sweetheart** ['swi:tha:t] *n* 1. sevgili; 2. əziz

**sweetish** ['swi:tɪʃ] *adj* şirintəhər, bir az şirin

**sweetness** ['swi:tnɪs] *n* şirinlik; təzəlik

**sweetshop** ['swi:tʃɔp] *n* qənnadı/şirniyyat mağazası

**sweet-stuff** [swi:tstʌf] *n top. i.* şirniyyat

**sweet-water** ['swi:t,wɔtə<sup>r</sup>] *adj* 1. şirin sulu, şirin suyu olan; 2. şirin suda yaşayan; ~ **fish** şirin suda yaşayan balıq

**swell**¹ [swel] *n* 1. yüksəklik, təpə, təpəlik, hündür yer; **~s and valleys** təpələr və dərələr; 2. şişmə, köpmə; şiş, köp; qabarma; 3. xırda/kiçik/xəfif ləpə; dalğa; 4. qalxma və enmə *(səs haq.)*; 5. *d.d.* modabaz, moda ilə/qəşəng/şıq geyinən adam; aristokrat, kübar adam; *What a swell you are! Sən/Siz necə də modabazsan!/ modabazsınız!*; 6. *d.d.* böyük/vacib şəxs/adam; *He's a swell in politics O, siyasətdə böyük/vacib adamdır;* 7. *d.d.* usta *(bir işdə)*; **to be a ~ at** *smth.* bir şeydə/ işdə usta olmaq; *He is a swell at football O, futbolda ustadır*; 8. fır *(ağacda)*

**swell**² [swel] *adj* əla, çox yaxşı/gözəl; **a ~ guy** əla oğlan; *We had a swell time Biz vaxtımızı çox yaxşı keçirdik*; **a ~ wedding** əla/çox yaxşı toy

**swell**³ [swel] *v (pt* **swelled** [sweld]; *pp* **swollen** ['swoulən] *və ya* **swelled** [sweld]) 1. şişmək, köpmək, dolmaq *(hava ilə, qazla)*, qabarmaq *(həm də* **to ~ out/up**); *The sails swelled (out) Yelkənlər qabardı; Wood often swells when wet Yaş/Nəm olanda çox vaxt taxta şişir; Her eyes swelled (up) with tears Onun gözləri ağlamaqdan şişdi*; 2. şişirtmək, köpdürmək, qabartmaq *(həm də* **to ~ out/up**); *The wind swelled the sails Külək yelkənləri qabartdı*; 3. yüksəlmək, qalxmaq; *The river is swollen Çay qalxıb*; 4. artmaq; çoxalmaq; *The ranks of the unemployed are daily swelling İşsizlərin sırası gündən-günə artır*; 5. dolmaq, dolu olmaq; *Her heart swelled Onun ürəyi doludur*; 6. lovğalanmaq, təkəbbürlənmək, iddia/təşəxxüs satmaq, özünü çəkmək/dartmaq; **to ~ like a turkey-cock** erkək hindxoruzu/erkək hinduşka kimi özünü dartmaq

**swelling**¹ ['swelɪŋ] *n* 1. şiş; **to have a ~ on the neck/back** boynunda/kürəyində şiş olmaq; *He has a swelling on his knee Onun dizində şiş var*; 2. şişmə; **the ~ of the buds** tumurcuqların şişməsi

**swelling**² ['swelɪŋ] *adj* 1. şişmiş, qabarmış; ~ **sails** qabarmış yelkənlər; 2. lovğa, təkəbbürlü, iddialı, özünü öyən, özündən deyən; ibarəli; ~ **oratory** təmtəraqlı natiqlik qabiliyyəti

**swellish** ['swelɪʃ] *adj d.d.* çox qəşəng/gözəl/zərif, dəbdə olan

**swelter**¹ ['sweltə<sup>r</sup>] *n* 1. bərk isti/bürkü/boğanaq; 2. yorulma, əldən düşmə *(istidən, bürküdən)*

**swelter**² ['sweltə<sup>r</sup>] *v* qüvvədən/haldan/əldən düşmək, üzülmək, yorulmaq *(istidən, bürküdən)*

**sweltering** ['sweltərɪŋ] *adj* 1. üzülən, haldan/əldən düşən, boğulan *(istidən, bürküdən)*; 2. bərk isti/bürkülü; **a ~ day** bərk isti/bürkülü gün

**swept** [swept] **to sweep** *felinin pt, pp formaları*

**swerve**¹ [swə:v] *n* sapma, kənara çıxma, uzaqlaşma *(məzənnədən və s.)*

**swerve**² [swə:v] *v* 1. sapmaq, kənara çıxmaq *(həm də məc)*, dönmək; *The road swerves to the left Yol sola dönür*; **to ~ from the straight path** düz yoldan sapmaq/çıxmaq; 2. qaytarmaq, sapdırmaq, döndərmək, yoldan çıxartmaq; **to ~ a ball** *id.* topu qaytarmaq/sapdırmaq; *Nothing can swerve me from any opinion Heç nə məni fikrimdən döndərə bilməz*

**swift** [swɪft] *adj* (-er, -est) 1. tez, cəld; **a ~ response** tez/cəld cavab; 2. sürətli, iti; **a ~ horse /car** sürətli at/maşın;



◊ *Be swift to hear, slow to speak Çox dinlə/ dinləyin, az danış/danışın*

**swift-handed** ['swɪft'hændɪd] *adj* cəld/zirək əlli

**swiftly** ['swɪftlɪ] *adv* cəld, tez; tələsik; **to answer** ~ cəld/tez cavab vermək

**swiftness** ['swɪftnɪs] *n* tezlik, itilik, sürət, cəldlik

**swig**¹ [swɪg] *n* böyük qurtum/udum; **to take a deep ~ of beer** pivədən bir böyük qurtum almaq

**swig**² [swɪg] *v* (-gg-) ağır-ağır çəkmək *(papirosu)*; yavaş-yavaş sümürmək *(şərabı)*

**swill**¹ [swɪl] *n* 1. yaxalama, suya çəkmə; **to give** *smth.* **a ~ (out)** bir şeyi yaxalamaq/suya çəkmək; 2. horra *(heyvan yeməyi)*; 3. spirtli içkilərdən həddən artıq istifadə etmə

**swill**² [swɪl] *v* 1. yaxalamaq, suya çəkmək; tökmək, axıtmaq *(suyu) (həm də* **to ~ out**); **to ~ (out) plates** boşqabları yaxalamaq; 2. *d.d.* acgözlüklə və çox içmək; doyunca içmək; **to ~ oneself with beer** doyunca pivə içmək

**swim** [swɪm] *v* (-mm-; *pt* **swam** [swæm]; *pp* **swum** [swʌm]) 1. üzmək; **to ~ on** *one's* **chest/on** *one's* **back/on** *one's* **side** sinəsi/arxası/yanı üstə üzmək; **to ~ under water** suyun altında üzmək; *I can't swim Mən üzə bilmirəm/üzməyi bacarmıram; She swims like a fish O, balıq kimi üzür*; **to ~ in luxury** *məc.* bolluq/sərvət içərisində üzmək; 2. süzmək *(ay, göz və s. haq)*; *The moon swims in the sky Ay göydə/səmada süzür*; 3. üzməyə məcbur etmək; **to ~ a horse across a river** atı çayı üzüb keçməyə məcbur etmək; 4. yayılmaq; *Everything swam before his eyes Hər şey onun gözləri qarşısında yayılırdı*; 5. gicəllənmək, başgicəllənməsi hiss etmək; *My head swims Mənim başım gicəllənir*;

◊ **to ~ like a stone** ≅ balta kimi üzmək; **to ~ with the stream** axına/əksəriyyətə qoşulmaq; **to ~ against the stream** əksəriyyətə qarşı getmək/ çıxmaq

**swimmer** ['swɪmə<sup>r</sup>] *n* 1. üzgüçü; **a strong/good/ fast ~** güclü/yaxşı/sürətli üzgüçü; 2. üzgəc

**swimming** ['swɪmɪŋ] *n* üzmə; üzgüçülük; **fancy/ medley ~** fiqurlu/kompleks üzmə; **competitive ~** idman üzgüçülüyü; *Shall we go swimming today? Bu gün üzməyə gedəcəyikmi?*

**swimming-bath** ['swɪmɪŋba:θ] *n* = **swimming pool**

**swimmingly** ['swɪmɪŋlɪ] *adv* rahat, asan, yağ kimi, maneəsiz; uğurla; *Everything is going on swimmingly Hər şey rahat/asan/uğurla/yağ kimi gedir*

**swimming pool** ['swɪmɪŋ'pu:l] *n* üzgüçülük hovuzu

**swimming suit** ['swɪmɪŋ'sju:t] *n* çimmək üçün kostyum

**swindle**¹ ['swɪndl] *n* kələk, aldatma, hiylə, fırıldaq, dələduzluq

**swindle**² ['swɪndl] *v* aldatmaq, kələk/fırıldaq gəlmək, dələduzluq/hiyləgərlik etmək; **to ~** *smth.* **out of** *smb.*, **to ~** *smb.* **out of** *smth.* bir şeyi bir kəsdən kələk/fırıldaq yolu ilə almaq; *I am not easily swindled Məni aldatmaq/Mənə kələk gəlmək elə də asan deyil*

**swindler** ['swɪndlə<sup>r</sup>] *n* fırıldaqçı, hiyləgər, dələduz, kələkbaz *(adam)*

**swine** [swaɪn] *n (cəmdə dəyişmir)* 1. *zool.* donuz; axta donuz *(ətlik üçün axtalanmış)*, qaban, erkək donuz; **to behave/to eat like a ~** donuz kimi davranmaq/yemək; 2. yaramaz, əclaf; 3. pinti, iyrənc, iyrənçi

**swineherd** ['swaɪnhə:d] *n* donuzotaran, donuz çobanı

**swing**¹ [swɪŋ] *n* 1. yellənmə, yırğalanma; yelləmə, yırğalama; **the ~ of the pendulum** kəfkirin yellənməsi *(saatda)*; 2. yelləncək; **children playing on the ~** yelləncəkdə oynayan /yellənən uşaqlar; 3. dönüş, dönüm, çevirmə, çevrilmə; **to give a handle a ~** dəstəyi döndərmək/çevirmək; 4. inkişaf, qızğın, çağ/vaxt; **in full ~** qızğın çağda; 5. hərəkət azadlığı; *He gave us full swing in the matter O bu işdə bizə tam azadlıq verdi*; 6. səfər, səyahət; **to return from a ~** səfərdən/səyahətdən qayıtmaq; 7. yandan zərbə *(boksda)*;

◊ **the ~ of the pendulum** 1) tərəqqi və tənəzzül, uğurun və uğursuzluğun növbələşməsi; 2) hakimiyyətdə olan partiyaların növbə ilə bir-birini əvəz etməsi

**swing**² [swɪŋ] *v (pt, pp* **swung** [swʌŋ]) 1. yellətmək, yelləmək; **to ~** *one's* **arms/***one's* **legs** qollarını / qıçlarını yelləmək/yellətmək; *He swung his arms as he walked Yeriyəndə o, qollarını yellətdi/yellədi;* 2. yellənmək, sallanmaq; **to ~ in the wind** küləkdə yellənmək; *The gymnast swung round on the parallel bars Gimnast turnikdə yelləndi; The bucket was swinging from the end of a rope Vedrə ipin ucundan sallanırdı*; 3. atmaq; *He swung the bag onto his back O, kisəni/çantanı dalına atdı*; 4. atılmaq, sıçramaq; **to ~ oneself into the saddle** yəhərə sıçramaq/atılmaq; *He swung himself (up) into the saddle O, yəhərə atıldı/sıçradı; The monkey swung from branch to branch Meymun budaqdan-budağa atıldı/sıçradı*; 5. asılmaq; *The lantern swung from the roof Fənər damdan asılmışdı*; 6. süzmək *(havada)*; *An eagle was swinging in the sky Qartal göydə/səmada süzürdü*

**swing-bridge** ['swɪŋbrɪdʒ] *n* açılan körpü

**swing-door** ['swɪŋdɔ:<sup>r</sup>] *n* ikitaylı/istənilən tərəfə fırlanan qapı

**swingeing** ['swɪndʒɪŋ] *adj* 1. *d.d.* çox iri/yekə /böyük, nəhəng, zorba; ~ **damages** çox böyük ziyan; ~ **taxes** çox böyük vergilər; 2. birinci, ən yaxşı, əla, birinci dərəcəli

**swingle[1]** ['swɪŋgl] *n k.t.* lifdidən/lifdarayan alət

**swingle[2]** ['swɪŋgl] *v* daramaq, çırpmaq, təmizləmək *(yunu və s.)*

**swipe[1]** [swaɪp] *n* 1. *d.d.* güclü/bərk/ağır zərbə; 2. güclü/bərk/ağır zərbə endirən adam

**swipe[2]** [swaɪp] *v d.d.* 1. bərk/qüvvə ilə vurmaq; **to ~ at the ball** topu bərk vurmaq; *He swiped the ball into the next field O, topu o biri meydana vurdu*; 2. acgözlüklə çox içmək, bir qurtumda içmək

**swirl[1]** [swə:l] *n* 1. girdab, burulğan *(suda) (həm də məc.)*; **a ~ of water** su burulğanı; **a ~ of dust** toz burulğanı; **in the ~ of modern life** müasir/çağdaş həyatın girdabında; 2. burum; **~s of smoke** tüstü burumları; 3. düyün *(oduncaqda)*

**swirl[2]** [swə:l] *v* 1. fırlatmaq, burulğanda/girdabda fırlanmaq; *The withered leaves were swirling round by the wind Külək qurumuş yarpaqları ətrafa fırladırdı*; 2. fırlanmaq, burulğanda/girdabda fırlanmaq; *The dust swirled through the air Toz havada fırlandı*; 3. baş gicəllənməsi hiss etmək; *My head swirls Mənim başım gicəllənir*

**swish[1]** [swɪʃ] *n* 1. vıyıltı, vızıltı, xışıltı; **the ~ of a cane** qamışın xışıltısı; **the ~ of silk** ipəyin xışıltısı; 2. çubuq, şüvül; çubuqla/şüvüllə zərbə

**swish[2]** [swɪʃ] *adj d.d.* qəşəng, zərif; bahalı; **a ~ hotel/ restaurant** bahalı mehmanxana/restoran

**swish[3]** [swɪʃ] *v* 1. yelləmək, yellətmək; *The horse swished its tail from side to side At quyruğunu o yan bu yana yellədi/yellətdi*; 2. yellənmək; *Her long gown swished as she walked Yeridikcə onun uzun donu yelləndi*

**Swiss[1]** [swɪs] *n* isveçrəli; **the ~** *top. i* isveçrəlilər

**Swiss[2]** [swɪs] *adj* İsveçrə; **~ cheese** İsveçrə pendiri

**switch[1]** [swɪtʃ] *n* 1. çubuq, qırmanc, qamçı; 2. süni/ qoyma saç; 3. dəyişdirmə, dəyişmə; qoşma, qoşulma; kəsmə, ayırma; 4. *məc.* dəyişiklik, dəyişmə *(mövzunu, söhbəti və s.)*; 5. *el.* elektrik açarı; **knife ~** rubilnik *(güclü elektrik cərəyanını kəsən açar)*; **main ~** baş/əsas elektrik açarı; 6. *d.y.* strelka

**switch[2]** [swɪtʃ] *v* 1. çubuqla/qamçı ilə vurmaq; qırmancla/qamçı ilə döymək, qamçılamaq, şallaqlamaq; 2. yelləmək; **to ~ *one's* whip** qamçısını yelləmək; 3. cəld hərəkət etmək; **to ~ *one's* head** başını cəld döndərmək; **to ~ *smth.* out of *smb.'s* hand** bir şeyi bir kəsin əlindən almaq/qarmalamaq/ çırpışdırmaq; 4. dəyişmək *(danışığın mövzusunu və s.; həm də* **to ~ off**); **to ~ conversation from one subject to another** söhbəti bir mövzusudan başqasına keçirmək; **to ~ places** yerləri dəyişmək; 5. *hərb.* istiqaməti dəyişmək; 6. *el.* dəyişdirmək *(elektrik cərəyanının istiqamətini)*; 7. *d.y.* başqa yola keçirmək *(qatarı)*; 8. budamaq *(ağacı)*; **to ~ off** cərəyanı kəsmək; **to ~ the light off** işığı söndürmək; **to ~ on** cərəyanı qoşmaq; **to ~ the light on** işığı yandırmaq

**switchboard** ['swɪtʃbɔ:d] *n* 1. bölüşdürücü şit /lövhə; 2. kommutator; **to operate the ~** kommutatorda işləmək, kommutatoru idarə etmək

**switch-man** ['swɪtʃmən] *n d.y.* (*pl* **-men** [-mən]) strelkaçı, yolayıran, yoldəyişdirən

**swollen[1]** ['swoulən] **to swell** *felinin pp forması*

**swollen[2]** ['swoulən] *adj* 1. şişmiş; **~ eyes** şişmiş gözlər; *He had twisted his ankle and it was badly swollen O, topuğunu burxutdu və onun topuğu bərk şişdi / şişmişdi*; 2. lovğa, təkəbbürlü, iddialı, özündən razı

**swoon[1]** [swu:n] *n* özündən getmə, ürəyi getmə, qəşş etmə, qəşş, bayğınlıq; **to fall into a ~** ürəyi getmək, qəşş etmək, bayılmaq

**swoon[2]** [swu:n] *v* 1. özündən getmək, qəşş etmək, bayılmaq; 2. əldən getmək; *All the girls are swooning over the new history teacher Bütün qızlar təzə tarix müəllimi üçün əldən gedirlər*

**swoop[1]** [swu:p] *n* 1. şığıma *(yırtıcı quş və s. haq.)*; 2. qəfil/gözlənilməz hücum

**swoop[2]** [swu:p] *v* 1. *(adət.* **to ~ down**) şığımaq, atılmaq; *The cat swooped down on the mouse Pişik siçanın üstünə atıldı; The eagle swooped down on its prey Qartal öz qurbanının üstünə şığıdı; Planes swooped over the enemy ship Təyyarələr düşmən gəmisinin üstünə şığıdı*; 2. tutmaq, yapışmaq, qapmaq, qarmalamaq, qapışdırmaq

**sword** [sɔ:d] *n* qılınc; **to drew the ~** 1) qılıncı qınından çıxartmaq; 2) *məc.* müharibə başlamaq; **to sheathe/to put up the ~** 1) qılıncı qınına qoymaq; 2) *məc.* müharibəni qurtarmaq/dayandırmaq; **to put to the ~** qılıncdan keçirmək

**swore** [swɔ:] **to swear** *felinin pt forması*

**sworn** [swɔ:n] *adj* and içmiş, and içməklə verilmiş; **a ~ witness/evidence** and içmiş şahid, and içməklə verilmiş ifadə

**swot[1]** [swɔt] *n d.d.* 1. ağır/çətin iş; 2. əzbərləmə; əzbər öyrənmə; **to have a ~ at a subject** hər hansı bir fənni əzbərləmək

**swot[2]** [swɔt] *v* (-tt-) əzbərləmək, əzbər öyrənmək; **to ~ for an exam** imtahan üçün əzbərləmək/əzbər öyrənmək; **to ~ up *one's* grammar** qrammatikanı əzbər öyrənmək

**swum** [swʌm] **to swim** *felinin pp forması*

**swung** [swʌŋ] **to swing** *felinin pp forması*

**sycophant** ['sɪkəfənt] *n* 1. yaltaq, qab dibi yalayan; 2. böhtançı, çuğulçu, donosçu

**sycophantic** [,sɪkə'fæntɪk] *adj* 1. yaltaq; 2. yalan, iftiralı,-böhtanlı, böhtanla dolu



**syllabic** [sɪ'læbɪk] *adj* heca, hecadüzəldən; **~ sounds** hecadüzəldən səslər

**syllable** ['sɪləbl] *n* heca; **words of one ~** birhecalı sözlər; **a four-~ word** dördhecalı söz; *"Arithmetic" is a word of four syllables "Arithmetic" dördhecalı sözdür*

**syllabus** ['sɪləbəs] *n* (*pl* **syllabuses** *və ya* **syllabi** ['sɪləbaɪ]) 1. icmal, plan; 2. proqram *(mühazirənin, fənnin və s.)*; 3. cədvəl

**syllogism** ['sɪlədʒɪzm] *n* sillogizm *(formal məntiqdə: məntiqi nəticə)*

**symbol** ['sɪmbl] *n* simvol, rəmz, əlamət; *The cross is the symbol of Christianity Xaç xristianlığın simvoludur/rəmzidir; The lion is the symbol of courage Şir/Aslan igidlik/qoçaqlıq rəmzidir*

**symbolic** [sɪm'bɔlɪk] *adj* simvolik; **~ description** simvolik/rəmzi təsvir

**symbolically** [sɪm'bɔlɪkəlɪ] *adv* rəmzi/simvolik olaraq

**symbolism** ['sɪmbəlɪzəm] *n* simvolizm

**symbolist** ['sɪmbəlɪst] *n* simbolist *(simvolizm tərəfdarı)*

**symbolization, -sation** [,sɪmbəlaɪ'zeɪʃn] *n* simvollaşdırma, simvollarla göstərmə

**symbolize, -ise** ['sɪmbəlaɪz] *v* simvollaşdırmaq, simvollarla göstərmək

**symmetric** [sɪ'metrɪk] *adj* simmetrik, mütənasib

**symmetrical** [sɪ'metrɪkl] *adj* = **symmetric**

**symmetrically** [sɪ'metrɪklɪ] *adv* simmetrik/mütənasib olaraq

**symmetry** [sɪ'mɪtrɪ] *n* simmetriya *(uyğunluq, mütənasiblik)*

**sympathetic** [,sɪmpə'θetɪk] *adj* 1. qanışirin, suyuşirin, məlahətli, cazibəli; **a ~ look/smile** məlahətli görünüş/təbəssüm; 2. şəfqətli; xeyirxah, acıma; **to be ~ to/towards *smth.*** bir şeyə acımaq

**sympathetically** [,sɪmpə'θetɪklɪ] *adv* hüsn-təvəccöhlə, hüsn-rəğbətlə, xeyirxahlıqla; şəfqətlə, mərhəmətlə

**sympathize, -ise** ['sɪmpəθaɪz] *v* **(with)** 1. şəfqət göstərmək, ürəyi yanmaq, dərdinə şərik olmaq; hüsn-rəğbət göstərmək: **to ~ with *smb.*** bir kəsə şəfqət göstərmək/ürəyi yanmaq, bir kəsin dərdinə qalmaq; 2. rəğbət/meyl göstərmək, xoşu gəlmək, xoşlamaq, bəyənmək; **to ~ with *smb.'s* scheme** bir kəsin planına rəğbət göstərmək/planını bəyənmək

**sympathizer, -iser** ['sɪmpəθaɪzə[r]] *n* rəğbət/ xeyirxahlıq göstərən *(adam)*; tərəfdar, havadar *(adam)*

**sympathy** ['sɪmpəθɪ] *n* 1. simpatiya, rəğbət, meyl, təvəccöh, hüsn-rəğbət; **to feel a ~ for *smb.*** bir kəsə rəğbət bəsləmək/məhəbbət göstərmək; 2. şəfqət, acıma, canıyanma; birinin dərdinə şərik olma; **to have no ~ for/with *smb.*** bir kəsə canı yanmamaq, bir kəsin dərdinə şərik olmamaq; 3. uyğunluq, mütabiqlik, müvafiqlik, bərabərlik; harmoniya; **to be in ~ with *smth.*** bir şeyə uyğun gəlmək; *Prices go up in sympathy with demand Qiymətlər tələbə uyğun/ müvafiq olaraq qalxır*; **to be out of ~ with *smth.*** bir şeyə müvafiq/uyğun olmamaq

**symphonic** [sɪm'fɔnɪk] *adj* simfonik, simfoniya; **~ music/poem** simfonik musiqi/poema

**symphony** ['sɪmfənɪ] *n mus.* simfoniya

**symposia** [sɪm'pouzɪjə] **symposium** *isminin cəm forması*

**symposium** [sɪm'pouzɪəm] *n* (*pl* **symposia**) simpozium *(beynəlxalq müşavirə)*

**symptom** ['sɪmptəm] *n* əlamət, simptom; **~ of a disease** xəstəliyin simptomu/əlaməti

**symptomatic** [,sɪmptə'mætɪk] *adj* simptomatik, əlamət; *Chest pains may be symptomatic of heart disease Sinə ağrıları ürək xəstəliyinin əlaməti ola bilər*

**synagogue** ['sɪnəgɔg] *n* sinaqoq *(yəhudi məbədi)*

**synchronization, -isation** [,sɪŋkrənaɪ'zeɪʃn] *n* sinxronizasiya, sinxronlaşdırma

**synchronize, -ise** ['sɪŋkrənaɪz] *v* 1. sinxronlaşdırmaq *(hadisələr arasında müvazilik yaratmaq)*; 2. sinxronlaşmaq, zamanca eyniləşmək; 3. tutuşdurmaq, tutuşdurub eyniləşdirmək *(saatı)*

**synchronizer, -iser** ['sɪŋkrənaɪzə[r]] *n tex.* sinxronizator *(sinxronizm yaradan cihaz)*

**synchronous** ['sɪŋkrənəs] *adj* sinxron, eynivaxtlı, eynizamanlı, eyni vaxtda/zamanda olan/baş verən; **~ translation** sinxron tərcümə; **~ events** eyni zamanda baş verən hadisələr

**synchronously** ['sɪŋkrənəslɪ] *adv* sinxron olaraq, eyni vaxtda/zamanda, bir vaxtda/zamanda

**syndrome** ['sɪndrəm] *n* sindrom *(hər hansı bir xəstəlik, hadisə üçün səciyyəvi olan əlamətlər)*

**synonym** ['sɪnənɪm] *n* sinonim; *"Shut" and "close" are synonyms "Shut" və "close" sözləri sinonimlərdir*

**synonymous** [sɪ'nɔnɪməs] *adj* sinonim; **~ words** sinonim sözlər

**synonymy** [sɪ'nɔnɪmɪ] *n* sinonimlik, sinonimika *(leksikologiyanın sinonimlərdən bəhs edən bölməsi)*

**synopsis** ['sɪnɔpsɪs] *n* (*pl* **synopses**) xülasə, konspekt; sinopsis *(bir məsələyə dair məqalələr, materiallar məcmuəsi)*

**syntactic** [sɪn'tæktɪk] *adj* sintaktik; **~ differences between English and Azerbaijani Turkish** ingilis dili və Azərbaycan türkcəsi arasında sintaktik fərqlər

**syntactically** [sɪn'tæktɪkəlɪ] *adv* sintaktik baxımdan/ nöqteyi-nəzərdən

**syntagma** [sɪn'tægmə] *n dilç.* sintaqma

**syntax** ['sɪntæks] *n* sintaksis

**syntheses** ['sɪnθəsi:z] **synthesis** *isminin cəm forması*

**synthesis** ['sɪnθəsɪs] *n (pl* **syntheses**) sintez
**synthesize, -ise** ['sɪnθəsaɪz] *v* sintezləşdirmək, sintez etmək, birləşdirmək
**synthesizer, -iser** ['sɪnθəsaɪzə^r] *n* sintezator; **to play the ~** sintezator çalmaq; **a voice/speech ~** səs/nitq sintezatoru
**synthetic[1]** [sɪn'θetɪk] *n* sintetik material/parça
**synthetic[2]** [sɪn'θetɪk] *adj* **1.** sintetik; **~ fabrics** sintetik parçalar; **2.** süni; **a ~ friendship** süni dostluq; **3.** *dilç.* sintetik; **~ languages** sintetik dillər
**synthetically** [sɪn'θetɪklɪ] *adv* süni yolla; **a ~ produced drug** süni yolla hazırlanmış dərman
**syphilis** ['sɪfɪlɪs] *n tib.* sifilis *(yoluxucu zöhrəvi xəstəlik)*
**syringe[1]** [sɪ'rɪndʒ] *n* **1.** şpris *(cihaz);* **2.** yanğınsöndürmə nasosu; nasos
**syringe[2]** [sɪ'rɪndʒ] *v* şprislə təmizləmək; **to ~ a wound/plant** yaranı/bitkini şprislə təmizləmək/ yumaq
**syrup[1]** ['sɪrəp] *n* sirop, iskəncəbi; meyvə şərbəti
**syrup[2]** ['sɪrəp] *v* **1.** sirop düzəltmək/hazırlamaq; qatılaşdırmaq; **2.** sirop/iskəncəbi qatmaq/tökmək
**system** ['sɪstəm] *n* **1.** qayda, metod; **a good ~ of teaching English** ingilis dilini öyrətməyin yaxşı qaydası/metodu; **2.** sistem; **the country's telephone ~** ölkənin telefon sistemi; **education ~** təhsil sistemi; **3.** quruluş; **political ~** siyasi quruluş; **4.** təlim; **a ~ of philosophy** fəlsəfi təlim; **5.** şəbəkə; **a railway ~** dəmiryol şəbəkəsi; **6.** orqanizm; *Strong drink is bad for the system Spirtli içkilər orqanizm üçün zərərlidir*
**systematic** [ˌsɪstɪ'mætɪk] *adj* sistematik, sistemli; müntəzəm, ardıcıl; **a ~ attempt to ruin smb.'s reputation** bir kəsin adını/şərəfini korlamaq üçün sistematik/müntəzəm cəhd; **a ~ error** müntəzəm/ardıcıl səhv; **to be ~** sistemli olmaq
**systematically** [ˌsɪstɪ'mætɪklɪ] *adv* müntəzəm, ardıcıl/ müntəzəm olaraq; *Someone had systematically broken every window of the house Kimsə müntəzəm olaraq evin bütün pəncərələrini sındırırdı*
**systematization, -isation** [ˌsɪstəmətaɪ'zeɪʃn] *n* sistemləşdirmə, sistemə/ qaydaya/ nizama salma
**systematize, -ise** ['sɪstəmətaɪz] *v* sistemləşdirmək, sistemə/nizama/qaydaya salmaq
**systematizer, -iser** ['sɪstəmətaɪzə^r] *n* sistemləşdirən, sistemə/qaydaya salan *(adam)*
**systemless** ['sɪstɪmlɪs] *adj* sistemsiz, qaydasız, tərtibsiz, üsulsuz



# T t

**T t** [ti:] *n (pl* **T's, t's** [ti:z]) *ingilis əlifbasının 20-ci hərfi*
**t** [ti:] *adj* T-şəkilli, T-yə oxşar; **T-cart** açıq uşaq arabası; açıq fayton; **T-beam** *tex.* damğalı tir; ◊ **to a ~** eynilə, tam, düz; **to hit it off to a ~** düz hədəfə dəymək/düşmək; **to know** *smth.* **to a ~** beş barmağı kimi bilmək; *It suits me to a T Bu məni tam qane edir; That suit fits you to a T Bu kostyum sənə/sizə lap yaxşı yaraşır; Bu kostyum elə bil sənin/sizin boyuna/boyunuza biçilibdir*
**ta[1]** [ta:] *n:* **to say a ~** *d.d.* sağ ol/olun demək
**ta[2]** [ta:] *inter. sl. Sağ ol/olun; Ta ever so Çox sağ ol/olun*
**tab[1]** [tæb] *n* **1.** paltarasan; ilmə; rəzə; **2.** qulaq *(papaqda);* **a fur cap with ~s over the ears** qulaqlı xəz papaq; **3.** *pl* qulaqlıq *(papaqda, radio aparatında, dəbilqədə);* **4.** ucluq *(ayaqqabı bağında, qaytanda);* **5.** şırma; etiket, yarlıq; **6.** *hərb.* ilgək, ilmə *(yaxalıqda);* **7.** *d.d.* hesab, haqq-hesab; **to keep a ~ / ~s on** *smth.* bir şeyin hesabını/uçotunu aparmaq; bir şeyə nəzarət etmək; **to keep close ~ on daily sales** gündəlik satılan malların dəqiq hesabını aparmaq; **to keep ~s on one's children** uşaqlara nəzarət etmək; **8.** *amer.* hesab *(restoranda, yeməkxanada və s.);* **to pick up the ~** hesabı ödəməyi üzərinə götürmək; xərci öz üzərinə götürmək; *The company picked up the tab for the annual picnic Şəhərkənarı ziyafətin keçirilməsinin illik xərclərini şirkət öz üzərinə götürdü;* **9.** borc *(əsas. barda, dükanda);* **to live on the ~** borc içində yaşamaq; **10. tablet** *sözünün qısaldılmış forması*
**tab[2]** [tæb] *v* **1.** tikmək, üstdən tikmək; bənd etmək, taxmaq; **2.** ayırmaq; təyin etmək; **3.** cədvəl şəklində planlaşdırmaq
**tabac** [tə'bæk] *adj* tütün rəngində, tütünrəngli
**tabanid** ['tæbənɪd] *n* = **tabanus**
**tabanus** ['tæbənəs] *n zool.* böyələk *(həşərat)*
**tabard** ['tæbəd] *n tar.* **1.** hərbçi-zadəganların plaşı/ bürüncəyi; **2.** carçı kostyumu *(orta əsrlərdə);* **3.** kasıbın üst paltarı *(orta əsrlərdə)*
**tabaret** ['tæbərɪt] *n* zolaqlı üzlük ipək parça
**tabasco** [tə'bæskou] *n* **1.** tünd ədviyyat *(həm də ~ sauce);* **2.** maraqlı hadisə; ədəbsiz lətifə
**tabby[1]** ['tæbɪ] *n* **1.** zolaqlı pişik *(həm də ~ cat);* **2.** köhnə qeybətçi; kinli/qərəzkar qadın; **3.** qarımış qız; **4.** xara *(ipək parça növü)*
**tabby[2]** ['tæbɪ] *adj* **1.** zolaqlı, ala bəzək, alaca; **2.** xara, xaradan tikilmiş; **~ gown** xara/xaradan tikilmiş xalat; **~ dress** xara paltar
**tabby[3]** ['tæbɪ] *v* **1.** zolaqlamaq, zolaq-zolaq etmək; **2.** ipəyi hamarlamaq, parıldatmaq *(dəzgahda, maşında)*
**tabefy** ['tæbɪfaɪ] *v (pt, pp* **-ied**) **1.** xərcləmək; əldən/ taqətdən salmaq; üzmək; **2.** xərclənmək, sərf olunmaq; əldən/taqətdən düşmək
**tabes** ['teɪbi:z] *n pl tib.* tabes *(bel sütununun çürüməsi)*
**tabetic[1]** [tə'betɪk] *n* tabesdən əziyyət çəkən adam
**tabetic[2]** [tə'betɪk] *adj* tabesli, tabesdən əziyyət çəkən
**tabinet** ['tæbɪnet] *n* poplin *(parça növü)*
**tablature** ['tæblətʃə^r] *n arx.* **1.** üstü yazılı lövhəcik; **2.** uydurma/təsəvvürə gətirilən şəkil; **3.** *mus.* tablatura *(instrumental musiqinin qədim not yazı sistemi)*
**table[1]** ['teɪbl] *n* **1.** stol, masa, miz; **dining-room ~** nahar stolu; **falling/folding ~** qatlanan /bükülən/ açılan stol; **a ~ with leaves** açılıb yığılan stol; **to clear the ~** stolu yığışdırmaq; **to take the head of the ~** stolun başında oturmaq; **pedestal ~** birayaqlı dəyirmi stol; **high /head/top ~** fəxri/əziz qonaq stolu; **a kitchen ~** mətbəx stolu; **a billiard ~** bilyard stolu; **to set/to lay the ~** süfrə/stol açmaq; **to set/to lay the ~ for two** iki nəfərlik stol açmaq; **2.** danışıqlar stolu *(həm də* **conference/ negotiations/ peace ~**); **to bring opposing sides to the conference ~** müxalif tərəfləri danışıqlar stolu arxasında oturtmaq; **3.** cərrahiyyə/ əməliyyat stolu *(həm də* **surgeon's/ operating ~**); **4.** stol arxasında/ süfrə başında yoldaşlıq; **to set the ~ in a roar** qonaqları şənləndirmək; **to keep the ~ amused** (stol arxasında) qonaqları əyləndirmək; *The whole table joined in the conversation Stol arxasındakıların hamısı söhbətə qoşuldu;* **5.** stol, qida; ərzaq; **for (the) ~** qida; **good/liberal /sumptuous ~** yaxşı/ təmtəraqlı/ zəngin stol; **the pleasures of the ~** yeməyin/ təamın ləzzəti; **to set a good ~** çox yaxşı stol açmaq; **to keep an open ~** duz-çörəkli/ qonaqpərvər olmaq; **6.** yemək, xörək; süfrə; **to be/to sit at ~** süfrə arxasında oturmaq; **to sit down to ~** stola oturmaq, yemək; **to rise from the ~** stoldan qalxmaq/durmaq; **to leave the ~** stolu tərk etmək, stoldan durub getmək; **to wait at ~** stola qulluq xidmət etmək; **7.** oyun stolu; **card/gaming ~** lomber stolu *(üstündə kart oynamaq üçün üstünə mahud çəkilmiş stol);* şahmat stolu; **8.** *pl* nərd oyunu; **9.** lövhə; **10.** sal, tava daşı, yastı daş; **11.** kitabə *(daş/metal üzərində yazı);* üzərində yazı olan lövhə; **the ten ~s, the ~s of the law** *din.* on vəsiyyət/ ehkam; **12.** cədvəl; sxem; **astronomical ~s** astronomik cədvəllər; **multiplication ~** *riyaz.* vurma cədvəli; **to learn one's**

**taxi**[1] [ˈtæksɪ] *n* taksi; **to hire/to take a ~** taksi tutmaq
**taxi**[2] [ˈtæksɪ] *v* **1.** taksi ilə getmək; taksidə getmək; *We taxied to the theatre Teatra biz taksi ilə getdik*; **2.** *av.* sükanı çevirmək; yerdə sürmək *(təyyarəni)*; **to ~ up to** yerlə sürüb gətirmək *(təyyarəni)*
**taxicab** [ˈtæksɪkæb] *n* = **taxi**[1]
**taxi-dancer** [ˈtæksɪ.da:nsəʳ] *n amer.* peşəkar tərəfdaş; peşəkar tərəfmüqabil *(rəqs etmək üzrə)*
**taxidermist** [ˈtæksɪdə:mɪst] *n* müqəvva dolduran adam
**taxidermy** [ˈtæksɪdə:mɪ] *n* müqəvva doldurma; müqəvvanın içinin doldurulması
**taxi-driver** [ˈtæksɪ.draɪvəʳ] *n* taksi sürücüsü
**taxi-man** [ˈtæksɪmən] *n* = **taxi-driver**
**taximeter** [ˈtæksɪ.mi:təʳ] *n* taksometr, sayğac
**taxi rank** [ˈtæksɪ.ræŋk] *n* taksi dayanacağı
**taxonomy** [tækˈsɔnəmɪ] *n* taksonomiya, təsnifat
**taxpayer** [ˈtækspeɪəʳ] *n* vergi ödəyicisi, vergi verən
**tea** [ti:] *n* çay; **strong/weak ~** tünd/açıq çay; *I'll put on some tea Mən çay qoyacam*; **to make/to brew ~** çay hazırlamaq/dəmləmək; **a cup of ~** bir fincan çay; **high ~** erkən verilən şam yeməyi
**tea bag** [ˈti:bæg] *n* çay paketi; kisəcikdə olan çay, birdəfəlik çay
**tea break** [ˈti:breɪk] *n* çay fasiləsi *(qısamüddətli tənəffüs: idarədə, zavodda və s.)*
**tea caddy** [ˈti:kædɪ] *n* çayqabı *(quru çayı saxlamaq üçün qab)*, çayriz
**tea pot** [ˈti:pɔt] *n* çaydan
**tea time** [ˈti:taɪm] *n* çay vaxtı *(günorta)*
**tea towel** [ˈti:tauəl] *n* çay dəsmalı
**tea-tray** [ˈti:treɪ] *n* çay podnosu; sini; məcməyi
**teach** [ti:ʃ] *v (pt, pp* **taught**) **1.** dərs demək/vermək; *She taught us history O bizə tarix dərsi/tarixdən dərs deyib;* **to ~ English/Russian** ingilis/rus dili dərsi demək; **2.** öyrətmək; **to ~ someone English** bir kəsə ingilis dili öyrətmək; *I taught them to swim Mən onlara üzmək öyrətdim*; **3.** təlim etmək, öyrətmək; *History teaches that... Tarix öyrədir ki,...; We were always taught that... Bizi həmişə öyrədiblər ki,...; The Greeks taught that... Yunanlar təlim edirdilər ki,...*; **4.** *məc.* tənbeh etmək, dərsini vermək; *I'll teach him a lesson! Mən ona dərs verəcəm/verərəm! That will teach him! Bu ona dərs olar!*
**teacher** [ˈti:ʃəʳ] *n* müəllim, müəllimə
**teaching**[1] [ˈti:ʃɪŋ] *n* **1.** dərs vermə; tədris; **2.** öyrətmə; öyrənmə; **3.** nəzəriyyə, doktrina
**teaching**[2] [ˈti:ʃɪŋ] *adj* müəllim, müəllimlik; **the ~ profession** müəllim/müəllimlik sənəti; **the ~ staff** müəllim heyəti; **~ load** tədris yükü; **~ experience** müəllimlik təcrübəsi
**teaching**[3] [ˈti:ʃɪŋ] **to teach** *felinin pr.p forması*
**teacup** [ˈti:kʌp] *n* çay fincanı
**tea dealer** [ˈti:.di:ləʳ] *n* çay alverçisi/ticarətçisi
**teahouse** [ˈti:haus] *n* çay evi, çayçı dükanı, çayxana
**teak** [ti:k] *n bot.* tik ağacı, hind palıdı

**tea leaf** [ˈti:li:f] *n* çay yarpağı
**team**[1] [ti:m] *n* **1.** qoşqu; bir yerdə qoşulmuş bir neçə at; **2.** briqada; qrup; işçi qrupu; **3.** *id.* komanda; taqım; **4.** gəmi heyəti
**team**[2] [ti:m] *adj* komanda, tağım; **~ championship** komanda birinciliyi; **~ sports** komanda idman növü
**team**[3] [ti:m] *v* **(to ~ up) 1.** birləşmək; **2.** əməkdaşlıq etmək; **3.** qoşmaq *(atı və s.)*
**team-mate** [ˈti:mmeɪt] *n* **1.** komanda yoldaşı; **2.** eyni briqadanın üzvü; eyni manqanın/dəstənin üzvü
**teamster** [ˈti:mstəʳ] *n* **1.** sürücü; arabaçı; **2.** *amer.* yük maşını sürücüsü
**team-work** [ˈti:mwə:k] *n* **1.** briqada işi; **2.** əməkdaşlıq; birgə səy; **3.** qarşılıqlı kömək; **4.** *id.* uyğunluq, ahəng; müntəzəmlik *(oyunçular arasında)*
**tear**[1] [tɪəʳ] *n* **I 1.** göz yaşı; **in ~s** göz yaşları içərisində; **to burst into ~s** ağlamağa başlamaq, ağlamaq; **~s of joy** sevinc yaşları; **with ~s in his/her eyes** gözləri yaşlı; *Tears came to my eyes Gözlərim yaşardı, Gözlərim yaşla doldu*; **to reduce** *smb.* **to ~s** bir kəsin ağlamağına bais olmaq, bir kəsi ağlatmaq; **2.** damcı *(şeh)*
**tear** [tɪəʳ] *n* **II 1.** kəsilmə, qırılma; **2.** deşik, dəlik; yırtıq; **3.** sürətli hərəkət; **full ~** çox cəld/tələsik, yel kimi; **4.** *tex.* siyrilmə; soyulma; qopardılma
**tear**[2] [tɛəʳ] *v (pt* **tore** [tɔ:ʳ], *pp* **torn** [tɔ:n]) **1.** cırmaq, yırtmaq; parça-parça/tikə-tikə etmək; **to ~ *one's* stocking** corabını cırmaq/yırtmaq; **to ~ *one's* dress on a nail** paltarını mismara ilişdirib cırmaq; **to ~ a sheet of paper in two** bir vərəq kağızı iki yerə bölmək/cırmaq; **2.** yaralamaq; cızmaq, sıyırmaq; *I have torn my finger Mən barmağımı yaralamışam*; **3.** *məc.* parçalamaq, dağıtmaq; ağrıtmaq; **to be torn between** iki yerə bölünmək; **4.** ayrılmaq, tərk etmək; *She could scarcely tear herself away from the scene O, mənzərədən çox çətinliklə ayrıldı; He could not tear himself away from the book O, kitabdan ayrıla bilmədi*; **5.** *məc.* yolmaq; *She tore her hair with rage O, qəzəbdən/hirsindən saçını yoldu*; **6.** cırılmaq, dağılmaq; *This material tears easily Bu parça tez cırılır; As I pulled the sheet out of the printer, it tore Mən vərəqi printerdən çəkəndə, o cırıldı*; **to ~ along/ down** sürətlə getmək, şütümək, çapmaq; *He tore along the road O, yol ilə sürətlə getdi*; **to ~ down/off** qopartmaq, uçurtmaq; sökmək; **to ~ down posters** plakatları qopartmaq; **to ~ down a building** binanı sökmək; *He tore off the bandage O, sarğını qopartdı*; **to ~ out** cırmaq, cırıb çıxartmaq; *The student tore a page out of a book Tələbə kitabın bir səhifəsini cırıb götürdü*
**tear-drop** [ˈtɪədrɔp] *n* göz yaşı, bir damla/damlacıq göz yaşı
**tear-duct** [ˈtɪədʌkt] *n anat.* göz yaşı kanalı
**tearful** [ˈtɪəful] *adj* **1.** gözüyaşlı; ağlayan; **2.** qəmli, kədərli; **~ farewell** qəmli/kədərli ayrılıq
**tearfully** [ˈtɪəfulɪ] *adv* ağlaya-ağlaya, gözüyaşlı; qan-yaş içində; kədərlə, qəmli-qəmli



**tear-gas** [ˈtɪəgəs] *n* gözyaşardıcı qaz
**tear-off** [ˈtɪərəf] *adj* cırılan, qopardılan; **a ~ calendar** cırılan təqvim
**tea-room** [ˈti:rum] *n* çayxana, çay evi
**tea-rose** [ˈti:rouz] *n* çaygülü
**tear-sheet** [ˈtɪəʃi:t] *n amer.* elan *(oxucunun qəzetdən kəsib sifariş kimi firmaya göndərə biləcəyi reklam səciyyəli)*
**tear-shell** [ˈtɪəʃel] *n hərb.* gözyaşardıcı qazı olan mərmi
**tear-stained** [ˈtɪəsteɪnd] *adj* gözüyaşlı, ağlamaqdan gözləri qızarmış
**tease**[1] [ti:z] *n* **1.** öcəşkən/dalaşqan/sataşqan adam; **2.** sataşmaq cəhdi, hirsləndirmək səyi
**tease**[2] [ti:z] *v* **1.** sataşmaq; acıqlandırmaq, cinləndirmək, hirsləndirmək; **to ~ someone about his being short** bir kəsə balacaboy olduğuna görə sataşmaq; **2.** təngə gətirmək, zəhlə aparmaq, bezdirmək, bezikdirmək; qəmiş olmaq, söz atmaq; *Don't tease your sister Bacını/Bacınızı bezdirmə/ bezdirməyin*
**teasel**[1] [ˈti:zl] *n* **1.** *bot.* çobandarağı; **2.** xov şişi
**teasel**[2] [ˈti:zl] *v toxuc.* xovlamaq, xov vermək
**teaseler** [ˈti:zləʳ] *n* xovlayıcı/xov verən fəhlə
**teaser** [ˈti:zəʳ] *n* **1.** = **tease** *(1-ci mənada)*; **2.** *d.d.* başsındıran bağlama; çətin tapşırıq
**tea-service** [ˈti:.sə:vɪs] *n* çay servizi
**tea-set** [ˈti:set] *n* = **tea-service**
**tea-spoon** [ˈti:spu:n] *n* çay qaşığı
**tea-strainer** [ˈti:.streɪnəʳ] *n* çay süzgəci *(çay süzəndə işlədilən)*
**teat** [ti:t] *n* **1.** məmə, döş giləsi; **2.** *tex.* tağalaq, makaracıq
**tea-table** [ˈti:.teɪbl] *n* çay stolu
**tea-urn** [ˈti:ə:n] *n* su qaynadan cihaz; samovar
**teazel, teazle**[1] [ˈti:zl] *n* = **teasel**[1]
**teazel, teazle**[2] [ˈti:zl] *v* = **teasel**[2]
**technical**[1] [ˈteknɪkəl] *n pl* **1.** xüsusi terminologiya; **2.** texniki təfsilat
**technical**[2] [ˈteknɪkəl] *adj* texniki; sənaye; **~ school** texniki məktəb; **~ terms** texniki terminlər; **due to a ~ hitch/fault** texniki səbəblərə/qüsurlara görə; **a ~ difficulty** texniki çətinlik
**technicality** [.teknɪˈkælɪtɪ] *n* **1.** texniki təfsilat/təfərrüat; **2.** rəsmiyyət; xırda təfərrüat
**technically** [ˈteknɪkəlɪ] *adv* **1.** texniki baxımdan/nöqteyi-nəzərdən; texniki; **2.** rəsmi/formal cəhətdən; *Technically you're correct Formal cəhətdən sən/siz düz deyirsən/deyirsiniz*
**technician** [tekˈnɪʃən] *n* texnik *(peşə texnikasını bilən adam)*
**technics** [ˈteknɪks] *n* texniki elmlər
**technique** [tekˈni:k] *n* **1.** yol, üsul; **2.** texniki vərdiş/ qabiliyyət
**technological** [.teknəˈlɔdʒɪkəl] *adj* texnoloji; texnologiya
**technologist** [tekˈnɔlədʒɪst] *n* texnoloq, texnologiya mütəxəssisi

**technology** [tekˈnɔlədʒɪ] *n* **1.** texnologiya; texnika; **2.** xüsusi terminologiya; **the ~ of computers** kompyuter terminologiyası
**tectonic** [tekˈtɔnɪk] *adj* **1.** arxitektura, memarlıq; **2.** *geol.* tektonik
**tedious** [ˈti:djəs] *adj* darıxdırıcı, cansıxıcı, ürəksıxan; yorucu
**tedium** [ˈti:djəm] *n* sıxıntı, ürək sıxıntısı, darıxma, üzüntü
**tee** [ti:] *n* hədəf, nişan *(oyunda)*; **to a ~** lap dəqiq, dübbədüz
**teem** [ti:m] *v* **(with)** vızıldaşmaq, qaynaşmaq, qaynamaq; dolu olmaq; *The lakeside teemed with gnats and mosquitoes Gölün ətrafında mığmığalar və ağcaqanadlar vızıldaşırdı; His head is teeming with bright ideas Onun beyni parlaq ideyalarla doludur; The rain was teeming down Güclü yağış yağırdı; The town is teeming with life Şəhərdə həyat qaynayır*
**teenage** [ˈti:neɪdʒ] *adj* yeniyetməlik, yeniyetmə *(13-19 yaş arasında)*; **a ~ son** yeniyetmə oğul; *She has two teen-age daughters Onun iki yeniyetmə qızı var*
**teenager** [ˈti:n.eɪdʒəʳ] *n* yeniyetmə *(13-19 yaş arasında oğlan və ya qız)*
**teener** [ˈti:nəʳ] *n* = **teenager**
**teeny** [ˈti:nɪ] *adj d.d.* bambalaca, kiçicik, dıqqılı
**teeter**[1] [ˈti:təʳ] *n amer.* uşaq yelləncəyi
**teeter**[2] [ˈti:təʳ] *v* **1.** yellənmək; **2.** *məc.* tərəddüd etmək, qərarsızlıq göstərmək
**teeth** [ti:θ] *n* **tooth** *isminin cəm forması*
**teethe** [ti:ð] *v* çıxmaq *(diş)*; *Baby is teething Uşağın dişi çıxır, Uşaq diş çıxarır*
**teethridge** [ˈti:θrɪdʒ] *n* alveollar, diş yuvaqları
**teetotal** [ti:ˈtoutl] *adj* ayıq, içki içməyən
**teetotaller** [ti:ˈtoutləʳ] *n* içki içməyən/dilinə içki vurmayan adam
**telautogram** [teˈlɔ:təgræm] *n* fototeleqram
**telautograph** [teˈlɔ:təgra:f] *n* fototeleqraf
**telecast**[1] [ˈtelɪka:st] *n* televiziya verilişi
**telecast**[2] [ˈtelɪka:st] *v* televiziya verilişi vermək; teleproqram vermək
**telecommunication** [ˈtelɪkə.mju:nɪˈkeɪʃn] *n* telerabitə; uzaq rabitə
**telefilm** [ˈtelɪfɪlm] *n* **1.** telefilm, televiziya filmi; **2.** televiziya ilə verilən film
**telegenic** [.telɪˈdʒenɪk] *adj* telegenik, televizor ekranında yaxşı görünən
**telegram** [ˈtelɪgræm] *n* teleqram
**telegraph**[1] [ˈtelɪgra:f] *n* teleqraf
**telegraph**[2] [ˈtelɪgra:f] *v* tel vurmaq, teleqrafla xəbər göndərmək/vermək
**telegrapher** [tɪˈlegrəfəʳ] *n* = **telegraphist**
**telegraphic** [.telɪˈgræfɪk] *adj* teleqraf: **~ address** teleqraf ünvanı, qısaldılmış ünvan
**telegraphist** [tɪˈlegrəfɪst] *n* teleqrafçı
**telegraph-line** [ˈtelɪgra:flaɪn] *n* teleqraf xətti

**telegraph-pole** [ˈtelɪgraːfpoul] *n* teleqraf dirəyi
**telegraphy** [tɪˈlegrəfi] *n* teleqrafiya, teleqraf işləri
**telemechanics** [ˌtelɪmɪˈkænɪks] *n pl* telemexanika
**telemeter** [ˈtelɪmiːtəʳ] *n* məsafəölçən *(aparat)*
**teleology** [ˌtelɪˈɔlədʒɪ] *n fəls.* teleologiya *(nəzəriyyə)*
**telepathy** [tɪˈlepəθɪ] *n* telepatiya
**telephone**¹ [ˈtelɪfoun] *n* telefon
**telephone**² [ˈtelɪfoun] *v* zəng etmək/çalmaq; telefon etmək; **to ~ news to *smb.*** telefonla bir kəsə xəbər vermək; *I'll telephone in the morning Mən səhər zəng edəcəm/edərəm*
**telephone set** [ˈtelɪfounˈset] *n* telefon aparatı
**telephonic** [ˌtelɪˈfɔnɪk] *adj* telefon; **~ station** telefon stansiyası; **~ bill** telefon qəbzi/kağızı *(ödəniş üçün)*
**telephonist** [tɪˈlefənɪst] *n* telefonçu, telefonist
**telephony** [tɪˈlefənɪ] *n* telefoniya *(telefon işləri)*
**telephotography** [ˈtelɪfəˈtɔgrəfi] *n* telefotoqrafiya
**telescope** [ˈtelɪskoup] *n* teleskop
**teletype** [ˈtelɪˈtaɪp] *n* teletayp
**teleview** [ˈtelɪvjuː] *v* televiziya verilişinə baxmaq
**televiewer** [ˈtelɪvjuːəʳ] *n* televiziya tamaşaçısı
**televise** [ˈtelɪvaɪz] *v* televiziya ilə göstərmək; **to ~ the Olympic Games** olimpiya oyunlarını televiziya ilə göstərmək; *The Olympic Games were televised Olimpiya oyunları televiziya ilə göstərildi*
**television** [ˈtelɪvɪʒn] *v* televiziya; *I saw him on television Mən onu televizorda gördüm*
**television set** [ˈtelɪvɪʒənˈset] *n* televizor, televiziya cihazı
**tell** [tel] *v (pt, pp* **told**) **1.** demək, söyləmək; danışmaq; **to ~ the truth** doğru danışmaq, həqiqəti söyləmək; **to ~ a lie** yalan danışmaq; *She told the news to everyone O, xəbəri hamıya danışdı*; **to ~ a story** hekayə danışmaq; *Don't tell a soul Heç kimə demə/deməyin*; **2.** göstərmək; **to ~ the time** vaxtı göstərmək *(saat haq.)*; **3.** xəbər vermək *(sirri)*; ağzından qaçırtmaq, açıb söyləmək; **4.** əmr etmək; buyurmaq, hökm etmək; *Tell the driver to wait for me De/Deyin, qoy sürücü məni gözləsin; Tell him to go away Ona de/deyin, qoy çıxıb getsin; Do as you are told Sənə/Sizə nə deyirlər, onu da et/edin*; **5.** fərqləndirmək, ayırmaq, təfavüt qoymaq; **to ~ one from the other** birini o birindən fərqləndirmək; *Can you tell Tom from his twin brother? They look exactly the same Tomu onun əkiz qardaşından fərqləndirə bilərsənmi/bilərsinizmi? Onlar bir-birinin eynidir; He can be told by his dress Onu geyimindən fərqləndirmək (tanımaq) olar*; **6.** bilmək, başı çıxmaq, xəbəri olmaq; *How do you tell which of these buttons to press? Hardan biləsən ki, bu düymələrin hansını basmaq lazımdır? You can never tell because appearance is often deceptive Baş tapa bilməzsən, çünki üzdən adamı tanımaq olmur (xarici görünüş adətən aldadıcı olur)*; **7.** **(to ~ off)** *d.d.* danlamaq, məzəmmət etmək; töhmətləndirmək; cəzalandırmaq; *That fellow needs to be told off O oğlanı danlamaq lazımdır; She told the typist off for making so many careless mistakes O, diqqətsizlik edərək çoxlu səhvlər etdiyinə görə makinaçını danladı*; **8.** qərara gəlmək; demək; bilmək; *It's hard to tell Demək çətindir; Who will tell? Kim bilir? Time will tell Zaman göstərəcək; How could I tell that... Mən hardan biləydim ki,..*; **9.** təsir etmək, özünü göstərmək; *The years are beginning to tell İllər öz təsirini göstərməyə başlayır. İllər öz işini görür; All this hard work is telling on him Bütün bu ağır işlər onun səhhətinə təsirini göstərir*; **10.** *d.d.* çuğulluq/xəbərçilik etmək; *You promised you wouldn't tell on me Söz verdin/verdiniz ki, məndən xəbərçilik etməyəcəksən/etməyəcəksiniz*
**tellable** [ˈteləbl] *adj* **1.** danışılası, deyiləsi, danışıla/ deyilə bilən; **2.** danışılmağa/danışmağa dəyən; danışmağa layiq
**teller** [ˈteləʳ] *n* **1.** hekayəçi, nağılçı, nağıl edən; **2.** səsləri hesablayan *(parlamentdə, məclisdə və s.)*; **3.** kassir *(bankda)*
**telling** [ˈtelɪŋ] *adj* **1.** təsirli, tutarlı; ifadəli; **a ~ speech** təsirli çıxış; **a ~ argument** tutarlı dəlil/sübut; **a ~ blow** təsirli/tutarlı zərbə; **2.** mənalı, çox mənalı; əhəmiyyətli; *These are telling figures Bu rəqəmlər çox əhəmiyyətlidir*
**telltale**¹ [ˈtelteɪl] *n* **1.** qeybətçi, boşboğaz; **2.** çuğulçu, xəbərçi, şeytan
**telltale**² [ˈtelteɪl] *adj* **1.** xain; satqın; **2.** bildirən, aşkar edən, üstünü açan; **a ~ blush** xainlik bildirən qızartı *(sifətdə, üzdə)*; **3.** səciyyəvi; nümunəvi, tipik; **~ sign** səciyyəvi əlamət
**tellurium** [teˈljuərɪəm] *n kim.* tellur *(kimyəvi element)*
**telly** [ˈtelɪ] *n d.d.* televizor, televiziya cihazı
**telpher**¹ [ˈtelfəʳ] *n tex.* telfer *(relslə hərəkət edən bucurğad)*
**telpher**² [ˈtelfəʳ] *v tex.* asma yolla/kanatla daşımaq
**telpherage** [ˈtelfərɪdʒ] *n* **1.** asma yol, kanat yolu; **2.** asma yolla/kanatla aparma/daşıma
**temerity** [tɪˈmerɪtɪ] *n* **1.** mühakiməsizlik; ağılsızlıq, düşüncəsizlik; ehtiyatsızlıq; başısoyuqluq; **2.** *amer.* cəsarət, cürət, hünər
**temper**¹ [ˈtempəʳ] *n* **1.** xasiyyət, ədəb; xüsusiyyət, keyfiyyət; **a sweet ~** yumşaq xasiyyət; **an ill ~** pis/səfeh xasiyyət; **bad ~** pis xasiyyət; **2.** hal, əhval, əhval-ruhiyyə; ovqat, kef; **to be in a good/bad ~** yaxşı/pis əhval-ruhiyyədə olmaq; **3.** təmkinlilik, səbirlilik; təmkin, səbir; dözüm, soyuqqanlılıq, özünü saxlama; **to keep *one's* ~** özünü/təmkinini saxlamaq; **to lose *one's* ~** özündən çıxmaq; səbri tükənmək; **to put *smb.* out of ~** bir kəsi özündən çıxartmaq/hirsləndirmək; **to recover/to regain *one's* ~** sakitləşmək, özünü ələ almaq; **4.** qəzəb, qeyz, hirs; **fit of ~** hirs, hirs tutma; *Tempers flared Qəzəblər cuşa gəldi*; **to get into a ~** acıqlanmaq, hirslənmək, qəzəblənmək; **5.** *kim.* tərkib *(karbonun)*; **6.** *tex.* bərklik / elastiklik dərəcəsi *(metallarda)*



**temper**² [ˈtempəʳ] *v* **1.** azaltmaq, əskiltmək, məhdudlaşdırmaq; yumşaltmaq, yüngülləşdirmək; **2.** bərkitmək, möhkəmlətmək *(metalı)*; **to ~ steel** poladı möhkəmlətmək; **3.** *məc.* bərkimək, möhkəmlənmək; *He tempered in battle O, döyüşdə bərkidi*
**tempera** [ˈtempərə] *n rəs.* **1.** tempera *(boya)*; **2.** şəkil *(boya ilə çəkilmiş)*
**temperament** [ˈtempərəmənt] *n* **1.** temperament, mizac, təbiət; *The two brothers have entirely different temperaments İki qardaşın tamamilə müxtəlif temperamentləri vardır*; **2.** coşğunluq, həvəs, ehtiras
**temperamental** [ˌtempərəˈmentl] *adj* temperamentli, ehtiraslı, coşğun, qızğın
**temperance**¹ [ˈtempərəns] *n* **1.** təmkinlilik, özünü/nəfsini saxlaya bilmə *(yeməkdən, spirtli içkilərdən)*; **2.** qənaətkarlıq; ayıqlıq
**temperance**² [ˈtempərəns] *adj*: **~ hotel** spirtli içkilər satılmayan mehmanxana; **a ~ society** spirtli içkilərin ləğv olunduğu cəmiyyət
**temperate** [ˈtempərɪt] *adj* mötədil, mülayim; **a ~ climate** mülayim iqlim; *Be more temperate in your language, please Zəhmət olmasa, danışığına/danışığınıza fikir ver/verin*
**temperature** [ˈtemprɪtʃəʳ] *n* **1.** temperatur, hərarət; **to take *one's* ~** temperaturunu ölçmək; **2.** *d.d.* yüksək hərarət/temperatur; **to have/to run a ~** yüksək temperaturu/hərarəti olmaq; *He has a temperature Onun yüksək temperaturu/hərarəti var*
**tempest**¹ [ˈtempɪst] *n* fırtına, boran, tufan; həyəcan; ◊ **~ in a teapot** boş şey üstündə həyəcan/ mübahisə/ qalmaqal
**tempest**² [ˈtempɪst] *v* **1.** həyəcan qaldırmaq/oyatmaq; **2.** coşmaq, şiddətlənmək
**tempestuous** [temˈpestjuəs] *adj* boranlı, tufanlı; coşğun, dalğalı; həyəcanlı; şiddətli; **~ night** boranlı/tufanlı gecə; **~ wind** şiddətli külək; **~ debate** coşğun mübahisə
**template** [ˈtemplɪt] *n tex.* şablon, basmaqəlib
**temple** [ˈtempl] *n* **1.** məbəd, ibadətxana; ibadətgah; kilsə; **2.** templ *(Londondakı iki vəkillər cəmiyyətindən biri və onun yerləşdiyi bina)*; **3.** gicgah
**templet** [ˈtemplɪt] *n* = **template**
**tempo** [ˈtempou] *n* **1.** *mus.* tempo; **2.** ritm, ahəng; temp, sürət
**temporal** [ˈtempərəl] *adj* **1.** müvəqqəti, keçici, ötücü; **2.** zaman; **3.** dünyəvi, dini olmayan; **4.** *anat.* gicgah
**temporality** [ˌtempəˈrælɪtɪ] *n* **1.** müvəqqətilik, müvəqqəti xarakter; **2.** *pl* kilsə mülkiyyəti və gəliri
**temporarily** [ˈtemprərəlɪ, ˌtempəˈrerəlɪ] *adv* müvəqqəti, müvəqqəti olaraq; hələlik; *He is temporarily out of work O, müvəqqəti olaraq işləmir; The telephone is temporarily disconnected Telefon müvəqqəti bağlanıb*
**temporary**¹ [ˈtempərərɪ] *n* müvəqqəti işçi/qulluqçu
**temporary**² [ˈtempərərɪ] *adj* müvəqqəti, keçici; ötücü; **~ address** müvəqqəti ünvan; **~ job** müvəqqəti iş; **to be ~** müvəqqəti/keçici xarakter daşımaq
**temporize, -ise** [ˈtempəraɪz] *v* gecikdirmək; vaxtı qəsdən uzatmaq; ləngitmək; yubatmaq
**temporizing, -ising** [ˈtempəraɪzɪŋ] *adj* ləngidilən, gecikdirilən; **a ~ answer** ləngidilən/gecikdirilən cavab
**tempt** [tempt] *v* **1.** tovlamaq, yoldan/başdan çıxartmaq, şirnikdirmək; azdırmaq; *One is tempted to ask the question Adam istər-istəməz sual vermək istəyir*; **2.** yoxlamaq, sınamaq, sınaqdan keçirmək; **to ~ fate** bəxtini sınamaq
**temptation** [tempˈteɪʃn] *n* cazibə, şirnikdirici/başdan çıxaran şey; **to lead *smb.* into ~** bir kəsi yoldan/başdan çıxarmaq
**tempter** [ˈtemptəʳ] *n* azdıran, tovlayan, yoldan /başdan çıxaran; tamaha salan; şirnikdirən, həvəsləndirən
**tempting** [ˈtemptɪŋ] *adj* azdırıcı, aldadıcı, tovlayan, yoldan/başdan çıxardan; şirnikdirici, tamahsılandırıcı; həvəsləndirici
**temptress** [ˈtemptrɪs] *n* azdıran, tovlayan, yoldan /başdan çıxaran; tamaha salan; şirnikdirən, həvəsləndirən *(qadın)*
**ten** [ten] *num* **1.** on; **~ times as big** on dəfə çox; **2.** onluq; **3.** on saylı; on dənə; on ədəd; **Room ~** on saylı otaq; **4.** *pl* onlarla; **~s of thousands of people** on minlərlə adam; **ten-year-olds** on yaşlılar
**tenable** [ˈtenəbl] *adj* **1.** məntiqli; idraklı, mühakiməli, şüurlu, dərrakəli; sağlam; **2.** məntiqə uyğun, ağlabatan; **~ argument** ağlabatan dəlil; *His theory is hardly tenable Onun nəzəriyyəsi az ağlabatandır*; **3.** tutula bilən *(yer, vəzifə və s.)*; *This position is tenable for a period of three years Bu vəzifə üç il müddətinə təklif olunur /tutula bilər*
**tenacious** [tɪˈneɪʃəs] *adj* **1.** möhkəm, bərk yapışan/tutan; **~ memory** möhkəm yaddaş; **to be ~ of life** həyatdan bərk yapışmaq; **to be ~ of *one's* rights** hüquqlarından möhkəm yapışmaq; **2.** inadlı, inadcıl; **~ of life** yaşamağa qabil; canıbərk
**tenacity** [tɪˈnæsɪtɪ] *n* **1.** inadcıllıq; inad, səbat, mətanət; tərslik; **2.** möhkəmlik, davamlılıq, dözüm, dayanıqlılıq; yenilməzlik; **3.** suvaşqanlıq, yapışqanlıq
**tenancy** [ˈtenənsɪ] *n* **1.** icarə, kirayə; **2.** icarə müddəti; **during my ~ of the farm** təsərrüfatı icarəyə götürdüyüm müddətdə; **3.** icarəyə götürülən/verilən torpaq/ev
**tenant**¹ [ˈtenənt] *n* **1.** icarədar, icarəyə götürən; (müvəqqəti) sakin; **~ at will** möhlətsiz/ömürlük icarədar; **2.** kirayənişinlik, kirayəçi *(evin, torpağın, mülkiyyətin və s.)*; **~ farmer** kirayəçi-fermer; **3.** *hüq.* daşınmaz mülkiyyət sahibi
**tenant**² [ˈtenənt] *v* kirayə etmək, icarəyə/kirayəyə götürmək; *These houses were tenanted by railway workers Bu evləri dəmiryol fəhlələri işçiləri kirayə ediblər/ kirayəyə götürüblər*

**tench** ['tentʃ] *n zool.* tinqa balığı
**tend** [tend] *v* **1.** qulluq etmək, baxmaq; **to ~ the sick** xəstəyə baxmaq/qulluq etmək; **2.** göz yetirmək, göz-qulaq olmaq; **to ~ sheep** qoyun güdmək/ otarmaq; **to ~ the fire** ocağa göz yetirmək; **3.** meyl göstərmək; əyilmək, enmək; *He tends to exaggerate O, şişirtməyə meyllidir/meyl göstərir; It tends to become cold at night Görünür, axşam soyuq olacaq; I tend to agree with you Mən səninlə/sizinlə razılaşmağa meylliyəm*
**tendency** ['tendənsı] *n* tendensiya, meyl; qabiliyyət; təmayül; *Business is showing a tendency to improve Biznes yaxşılaşmağa doğru meyl göstərir; He has a tendency to... Onun ... meyli var*
**tendentious** [ten'denʃəs] *adj* meylli, müsbət meylli; tendensiyalı
**tender**[1] ['tendəʳ] *n* **1.** tender, təklif, arzu; **2.** ödəniş vasitəsi/ vəsaiti; **legal ~** qanuni ödəniş vəsaiti; **3.** tender; müsabiqə; **4.** üzən baza; **5.** məbləğ *(borcun ödənilməsi üçün)*; **6.** xidmət göstərən şəxs; **a baby ~** dayə, qulluq göstərən *(uşağa, xəstəyə)*
**tender**[2] ['tendəʳ] *adj* **1.** zərif, incə; məlahətli, yumşaq, lətif; **~ skin** zərif dəri; **~ voice** məlahətli səs; **~ caress** zərif nəvaziş; **2.** həssas; təsirli; **~ spot** həssas yer, zəif nöqtə; **3.** yumşaq; mülayim, həlim; yüngül
**tender**[3] ['tendəʳ] *v* **1.** təklif etmək; **to ~ *one's* thanks** təşəkkür etmək; **to ~ an apology** üzr istəmək; **to ~ *one's* resignation** istefa vermək, istefaya çıxmaq; **2.** vermək; irəli sürmək, təklif etmək; *Our firm has tendered for building a new bridge Təzə körpü tikilməsi üçün bizim şirkət tender keçirib*
**tender-eyed** ['tendəraıd] *adj* **1.** zərif baxışlı/gözlü; **2.** zəif görən
**tender-hearted** ['tendə'ha:tıd] *adj* ürəyiyumşaq, ürəyiyuxa; yumşaqürəkli, rəhmdil, rəhmli, şəfqətli, mərhəmətli
**tenderloin** ['tendəlɔın] *n amer.* **1.** kəsik, kəsilib götürülən parça/hissə; can əti; **2.** işrətxana, eyş-işrət yeri; şəhərdə hər cürə nalayiq iş yapılan yer
**tenderly** ['tendəlı] *adv* şəfqətlə, riqqətlə, nəvazişlə, incəliklə, sevə-sevə
**tenderness** ['tendənıs] *n* **1.** zəriflik, incəlik; **2.** mehribanlıq, riqqət, şəfqət
**tendon** ['tendən] *n anat.* vətər
**tendril** ['tendrıl] *n bot.* bığcıq
**tenement** ['tenımənt] *n* **1.** çoxmənzilli ev; **2.** *hüq.* yaşayış evi; **3.** icarəyə verilən/götürülən ev/bina; icarəyə götürülən/verilən mülkiyyət
**tenet** ['ti:net] *n* **1.** prinsip; mövqe; müddəa; **2.** ehkam, doktrina, nəzəriyyə
**tenfold**[1] ['tenfould] *adj* onqat, on dəfə, on misli
**tenfold**[2] ['tenfould] *adv* on dəfə/kərə, onqat
**tenner** ['tenəʳ] *n* **1.** 10 funtluq banknot; **2.** *amer.* 10 dollarlıq banknot
**tennis**[1] ['tenıs] *n* tennis
**tennis**[2] ['tenıs] *adj* tennis; **~ court** tennis kortu/meydançası; **~ player** tennisçi, tennis oynayan, tennis oyunçusu; **table-~** stolüstü tennis
**tenon** ['tenən] *n* **1.** *tik.* mil, uc, diş; çıxıntı; **2.** *tex.* şpilka; dilçək
**tenor** ['tenəʳ] *n* **1.** *mus.* tenor *(səs, müğənni)*; **2.** cərəyan; məslək; istiqamət; **3.** ümumi məzmun; *She knew enough Spanish to get the tenor of what was being said Deyilənlərin ümumi məzmununu anlamaq üçün o, ispan dilini kifayət qədər bilirdi*; **4.** surət, üz, dublikat *(sənəd)*
**tense**[1] [tens] *n qram.* zaman; **the present/past ~** indiki/keçmiş zaman
**tense**[2] [tens] *adj* **1.** gərgin; dartılmış, çəkilmiş, gərilmiş; **~ atmosphere** gərgin şərait; **~ rope** dartılmış kəndir; **~ nerves** dartılmış/gərilmiş əsəblər; **2.** əsəbi, qızğın; gərginlik; **~ anxiety** əsəb gərginliyi; *We were tense with expectancy Bizim gözləməkdən əsəblərimiz gərilmişdi*
**tense**[3] [tens] *v* **1.** gərmək, gərginləşdirmək; güc vermək; **to ~ *one's* muscles** əzələlərini gərmək; **2.** gərilmək, gərginləşmək; dartılmaq; **3.** gərginlik yaratmaq
**tensely** ['tenslı] *adv* gərgin, gərgin surətdə, gərgin bir halda/tərzdə
**tensile** ['tensaıl] *adj* **1.** *tex.* dartıla bilən; elastik; **2.** müxtəlif məna verilə bilən, müəyyən/qəti olmayan
**tension** ['tenʃn] *n* **1.** gərginlik; gərgin vəziyyət/hal; **international ~** beynəlxalq gərginlik; **to heighten/ to increase ~** gərginliyi artırmaq; **to alleviate/to ease/to lessen/to relieve/to reduce ~** gərginliyi azaltmaq/zəiflətmək; **2.** *el.* gərginlik, cərəyan; **high/low ~** yüksək/zəif gərginlik; **3.** ziddiyyət, təzad; **racial ~s** irqi ziddiyyətlər; **political ~** siyasi təzad; **4.** dartılma, gərilmə; **5.** təzyiq *(qaz, buxar və s.)*
**tensity** ['tensıtı] *n* gərgin hal/vəziyyət, gərginlik
**tensive** ['tensıv] *adj* gərginlik yaradan/törədən
**tent**[1] [tent] *n* **1.** çadır, alaçıq; **to erect/to pitch/to put up a ~** çadır qurmaq; **oxygen ~** oksigen yastığı; **to take down a ~** çadır sökmək; **2.** *tib.* tampon, tıxac; piltə
**tent**[2] [tent] *adj* çadır, alaçıq; **~ city** çadır şəhərciyi
**tent**[3] [tent] *v* **1.** çadır qurmaq; çadırda yaşamaq; **2.** *tib.* tampon/piltə qoymaq; tıxac salmaq
**tentacle** ['tentəkl] *n* **1.** *zool.* buynuz *(böcəklərdə, qurdlarda və s.)*; **2.** *bot.* bığcıq
**tentative** ['tentətıv] *adj* **1.** sınaq, yoxlama; *We made tentative plans to move Biz köçmək üçün sınaq planı hazırladıq*; **2.** ilk, ilkin; qabaqcadan/əvvəlcədən olan; **to make a ~ suggestion** ilkin təklif irəli sürmək; **3.** şərti
**tentatively** ['tentətıvlı] *adv* şərti, şərti olaraq
**tent-bed** ['tentbed] *n* səyyar çarpayı
**tenterhooks** ['tentəhuks] *n pl* dartılıb taxılan cəftə; ◊ **to be on ~** ≅ iynə üstündə oturmaq; **to keep *smb.* on ~** ≅ bir kəsi narahat vəziyyətdə saxlamaq



**tenth** [tenθ] *num* onuncu; **one ~ of the population** əhalinin onda bir hissəsi; **three ~s** onda üç
**tenuous** ['tenjuəs] *adj* **1.** nazik; cüzi *(fərq barədə)*; **2.** davamsız, təzdağılan; təzsınan; *The evidence is a little tenuous Sübut bir qədər tutarlı deyil*; **3.** seyrəkləndirilmiş; seyrək *(hava haq.)*
**tenure** ['tenjuəʳ] *n* **1.** sahib olma, yiyələnmə; yiyəlik, sahiblik; **2.** olma, qalma, gəlmə; *The President's tenure of office is four years Prezidentin səlahiyyət müddəti dörd ildir*; **3.** əvəzedilməzlik, dəyişdirilməzlik
**tepefy** ['tepıfaı] *v* **1.** yüngülcə isitmək/qızdırmaq; **2.** isinmək, qızmaq *(yüngülcə)*
**tepid** ['tepıd] *adj* **1.** istitəhər; ılıq; **2.** *məc.* sərin, soyuq *(əlaqə, münasibət və s. haq.)*
**teratology** [,terə'tələdʒı] *n biol.* teratologiya *(orqanizmlərin anadangəlmə eybəcərliyini öyrənən elm)*
**tercel** ['tə:səl] *n* şahin, qızılquş, tərlan *(erkək)*
**tercentenary**[1] [,tə:sen'ti:nərı] *n* üçyüzillik; üçyüzillik ildönümü
**tercentenary**[2] [,tə:sen'ti:nərı] *adj* üçyüzillik
**tercet** ['tə:sıt] *n* **1.** üç misradan ibarət şer; üç misralı bənd; **2.** *mus.* terset *(üç səs və ya alət üçün yazılmış musiqi əsəri)*
**teredo** [tər'i:dou] *n zool.* gəmi qurdu; ağacovan qurd *(tırtıl)*
**terete** [te'ri:t] *adj* silindrşəkilli, silindrik, silindrvarı
**tergal** ['tə:gəl] *adj anat.* bel, dorsal *(beldə olan)*
**term**[1] [tə:m] *n* **1.** müddət; **~ of office** səlahiyyət/vəzifə müddəti; **~ of lease** kirayə müddəti; **prison ~** həbs müddəti; **to be elected for a four-year ~** dördillik müddətə seçilmək; **2.** semestr, yarımillik; **end-of- ~ examinations** semestr imtahanları; **3.** termin; **technical/scientific ~** texniki/ elmi termin; **a contradiction in ~s** terminlər arasındakı ziddiyyət; **4.** *d.d.* hədd, sərhəd; **5.** *pl* ifadə, izhar, ifadə etmə/edilmə, izhar etmə/edilmə; **in flattering ~s** xoşagələn ifadələrlə; **6.** *pl* şərt(lər) *(müqavilədə, sazişdə)*; **on favourable ~s** əlverişli/ münasib şərtlərlə; **~s of payment** ödəniş şərtləri; **on *one's* own ~s** öz şərtlərilə; *What are your terms? Sənin/ Sizin şərtlərin/şərtləriniz nədir?*; **7.** *pl* əlaqələr, münasibətlər; **to be on good/bad ~s (with)** bir kəslə yaxşı/pis münasibətdə olmaq; *We are on friendly terms with them Biz onlarla dostluq münasibətindəyik*; **8.** *riyaz.* hədd
**term**[2] [tə:m] *v* ifadə etmək, adlandırmaq; *He terms himself a doctor O özünü həkim adlandırır; I term it a disgrace Mən bunu biabırçılıq adlandırıram; He has no right to term himself a professor Onun özünü professor adlandırmağa haqqı yoxdur*
**termagant**[1] ['tə:məgənt] *n* ifritə, acıdil *(qadın)*
**termagant**[2] ['tə:məgənt] *adj* davakar, öcəşkən, dalaşqan, cəncəl, acıdil
**terminal**[1] ['tə:mnl] *n* **1.** vağzal, sonuncu stansiya; **bus ~** avtovağzal; **air ~** aerovağzal; **2.** *el.* klemma, sıxac; **the ~s of a battery** batareyanın klemmaları; **3.** terminal; **Sangachal ~** Səngəçal terminalı
**terminal**[2] ['tə:mnl] *adj* **1.** sonuncu, yekun; **~ station** sonuncu stansiya; **2.** *tib.* son; xarab, ağır; *He is a terminal case O, ölümcül/ağır/sağalmaz xəstədir*
**terminate** ['tə:mıneıt] *v* **1.** son/hədd qoymaq; xitam vermək; **to ~ a contract** müqaviləni pozmaq; **2.** qurtarmaq, başa çatmaq, yekun vurmaq; **to ~ pregnancy** hamiləlikdən yarımçıq qurtarmaq; *The meeting will terminate at 6 o'clock İclas saat 6-da qurtaracaq*; **words that ~ in a vowel** saitlə qurtaran sözlər
**termination** [,tə:mı'neıʃn] *n* **1.** son, yekun, axır; **2.** kəsmə, kəsilmə; dayandırma; qurtarma; **3.** pozma, ləğv etmə *(sazişi, müqaviləni və s.)*; **4.** nəticə; axır, yekun
**terminology** [,tə:mı'nɔlədʒı] *n* terminologiya; terminlər, istilahlar
**termitary** ['tə:mıtərı] *n* (ağ) qarışqa yuvası
**termite** ['tə:maıt] *n* termit, ağ qarışqa
**termless** ['tə:mlıs] *adj* **1.** hədsiz, sərhədsiz; **2.** müddətsiz; **3.** şərtsiz; müstəqil
**term-time** ['tə:mtaım] *n* dərs müddəti/vaxtı *(məktəbdə, kollecdə və s.)*
**tern** [tə:n] *n* su qaranquşu
**ternary**[1] ['tə:nərı] *n* üç, üçlük; triada
**ternary**[2] ['tə:nərı] *adj* üçqat; üç dəfə böyük, üç misli; üç hissəli
**terrace** ['terəs] *n* **1.** terras, səki; **2.** eyvan, balkon, artırma; **3.** evlərin cərgəsi *(küçə boyu)*; **4.** *id.* tribuna; **the ~s** stadionun tribunaları; **5.** küçənin ortasındakı çəmənlik
**terracotta**[1] ['terə'kɔtə] *n* terrakota *(bişirilmiş sarı və ya qırmızı gil; bu gildən qayrılmış məmulat)*
**terracotta**[2] ['terə'kɔtə] *adj* terrakotadan hazırlanmış, terrakota; **a ~ vase** terrakota/terrakotadan hazırlanmış vaza
**terrain** ['tereın] *n* **1.** yer; ərazi; **~ of attack** hücum yeri; **2.** yerin fiziki xüsusiyyətləri; topoqrafiya; **difficult ~ for heavy vehicles** ağır nəqliyyatın keçməsi üçün çətin yer
**terrapin** ['terəpın] *n* **1.** su tısbağası; **2.** tısbağa əti
**terrestrial** [tı'restrıəl] *adj* **1.** dünyəvi; **2.** quru; yer üzü; **the ~ parts of the world** dünyanın quru/torpaq hissələri; **a ~ globe** Yer kürəsinin torpaq sahəsi; **3.** yerüstü, quru
**terrible** ['terəbl] *adj* **1.** dəhşətli, qorxulu, müdhiş, qorxunc; **a ~ tragedy** dəhşətli faciə; **2.** şiddətli; son dərəcə; *The heat is terrible in Baghdad during the summer Bağdadda yay zamanı isti dəhşətli olur*; **3.** *d.d.* çox pis; *My room was in a terrible state of disorder Mənim otağım çox pis səliqəsiz bir vəziyyətdə idi*; **~ weather** çox pis hava; *Our guest had terrible manners Bizim qonağımızın davranışı çox pis idi*

**terribly** [ˈterəblɪ] *adv* olduqca, həddən artıq, son dərəcə; *I am terribly tired Mən son dərəcə yorulmuşam; I am terribly sorry Mən çox üzr istəyirəm*
**terrier** [ˈterɪə$^r$] *n* **1.** teryer *(it cinsi)*; **2.** *tar.* torpaq dəftəri
**terrific** [təˈrɪfɪk] *adj* **1.** dəhşətli, qorxunc; ~ **speed** qorxulu/dəhşətli dərəcədə yüksək sürət; ~ **noise** qorxunc/dəhşətli səs; **2.** *d.d.* çox gözəl/qəşəng; təəccüblü; çox güclü; heyranedici; *We had terrific time Biz vaxtımızı çox gözəl keçirdik*
**terrify** [ˈterɪfaɪ] *v (pt, pp* **-ied**) bərk qorxutmaq, dəhşətə/vahiməyə salmaq; *It terrifies us that there may be another earthquake Daha bir zəlzələnin baş verməsi bizi bərk qorxudur; They were terrified by the thunder Şimşək çaxması onları bərk qorxutdu*
**terrifying** [ˈterɪfaɪɪŋ] *adj* dəhşətli, qorxulu, qorxunc; *It was terryfying to watch Baxmaq dəhşətli/qorxulu idi; It is terrifying that there are so many drunk drivers on the road Yolda bu qədər sərxoş sürücülərin olması dəhşətdir*
**territorial** [ˌterɪˈtɔ:rɪəl] *adj* **1.** ərazi; torpaq, territorial, məhəlli; ~ **waters** məhəlli sular; ~ **claims** ərazi/torpaq iddiaları; **2.** *hərb.* məhəlli; ~ **army** məhəlli ordu
**territory** [ˈterɪtərɪ] *n* ərazi, torpaq, sahə, yer; **to occupy** ~ ərazini işğal etmək; **an occupied** ~ işğal olunmuş ərazi/torpaq; **to cede** ~ torpağı vermək/təslim etmək; **neutral** ~ neytral sahə, şəffaf ərazi
**terror** [ˈterə$^r$] *n* **1.** qorxu, vahimə, dəhşət; **to run away in** ~ qorxu/vahimə içərisində qaçıb getmək; **to be in ~ of *one's* life** həyatından/canından qorxmaq; **2.** qorxu törədən şey/şəxs; **to strike ~ into the hearts of people** camaatın ürəyinə qorxu salmaq; **3.** *siya.* terror; **4.** *d.d.* çətin adam; narahat/dəcəl uşaq; *That child is a holy terror O uşaq tamam bəladır*
**terrorism** [ˈterərɪzm] *n* terrorizm, terrorçuluq; *Terrorism is evil Terrorizm bəladır; Terrorism is a crime Terrorizm cinayətdir*
**terrorist** [ˈterərɪstl] *n* terrorçu, tədhişçi
**terrorize, -ise** [ˈterəraɪz] *v* qorxutmaq, dəhşətə/qorxuya salmaq
**terror-stricken** [ˈterəˌstrɪkən] *adj* qorxuya/vahiməyə çulğalanmış; qorxu içərisində olan
**terry** [ˈterɪ] *n* **1.** xov; narın tük; **2.** *amer.* = **terry-cloth**
**terry-cloth** [ˈterɪklɔθ] *n* saçaqlı parça *(hamam xalatı, döşəkağı/mələfə və s. üçün)*
**terry-cloth robe** [ˈterɪklɔθˈroub] *n* hamam xalatı
**terse** [tə:s] *adj* **1.** qısa, yığcam *(üslub)*; müxtəsər; **2.** öz fikrini müxtəsər/yığcam söyləyən *(natiq haq.)*
**terseness** [ˈtə:snɪs] *n* yığcamlıq, müxtəsərlik
**tertian** [ˈtə:ʃən] *n tib.* malyariya; qızdırma, isitmə
**tertiary** [ˈtə:ʃərɪ] *adj geol., tib.* üçüncü *(dərəcə, dövr, sıra və s.)*; **the ~ period** süxur yaranmasının üçüncü dövrü

**terzetto** [tə:tˈsetou] *n mus.* terset *(üç səs və ya alət üçün yazılmış musiqi əsəri)*
**tessellated** [ˈtesɪleɪtɪd] *adj* mozaik, quraşdırılma *(bəzək, şəkil haq.)*; **a ~ pavement** mozaik/dama-dama səki
**tessera** [ˈtesərə] *n (pl* **tesserae**) dama; xana *(mozaikada)*
**test**[1] [test] *n* **1.** sınaq, sınama, yoxlama; **to put to** ~ sınamaq, sınağa çəkmək; **to bear the** ~ sınaqdan çıxmaq, sınağa dözmək; **methods that have stood ~ of time** zamanın sınağından çıxmış metodlar; ~ **of strength** gücü sınama; **underground nuclear** ~ yeraltı nüvə sınağı; **2.** imtahan; yoxlama işi; **mathematics** ~ riyaziyyat imtahanı; **spelling** ~ orfoqrafik imla; **a driving** ~ sürücülük imtahanı; **3.** *tib.* təhlil, yoxlama, analiz; **a blood** ~ qan analizi
**test**[2] [test] *adj* sınaq, sınama, yoxlama; sınaqdan keçirmə, təcrübədən çıxartma; ~ **flight** sınaq uçuşu; ~ **case** nümunəvi hadisə; səciyyəvi hal; ~ **match** yoxlama görüşü
**test**[3] [test] *v* sınamaq, yoxlamaq, sınaqdan /təcrübədən keçirmək; **to ~ (out) a new aircraft** yeni təyyarəni sınaqdan keçirmək; **to ~ a metal for duration** metalın davamlılığını yoxlamaq; **to ~ someone's knowledge of history** bir kəsin tarixdən biliyini yoxlamaq; **to ~ a theory out in practice** nəzəriyyəni təcrübədə yoxlamaq/sınaqdan keçirmək; **to ~ a new drug** təzə dərmanı sınaqdan keçirmək; **to ~ the microphones** mikrofonları yoxlamaq; **to have *one's* eyesight ~ed** görmə qabiliyyətini yoxlatdırmaq *(özünün)*
**testament** [ˈtestəmənt] *n* **1.** vəsiyyət; vəsiyyətnamə; **last will and** ~ son istək və vəsiyyət; **2.** məsləhət; əhdi-cədid *(İncil və başqa xristian kitablarının adı)*; **Testament** Əhdi-Cədid məsləhəti
**testamentary** [ˌtestəˈmentərɪ] *adj* vəsiyyətlə; vəsiyyətnamə ilə verilən
**testator** [tesˈteɪtə$^r$] *n* vəsiyyət edən, vəsiyyətçi
**testatrix** [tesˈteɪtrɪks] *n* vəsiyyətçi/vəsiyyət edən qadın
**test ban** [ˈtestbæn] *n* nüvə sınaqlarının qadağan olunması/edilməsi
**tester** [ˈtestə$^r$] *n* **1.** sınaqçı, təcrübəçi; **2.** laborant, laboratoriya işçisi; **3.** sınaq cihazı; yoxlama aləti; **4.** bəzəkli talvar, taxt-rəvan *(çarpayının üstündə)*
**testicle** [ˈtestɪkl] *n anat.* yumurtacıq; xaya
**testify** [ˈtestɪfaɪ] *v (pt, pp* **-ied**) **1.** ifadə vermək; şahidlik etmək; **to ~ to** lehinə ifadə vermək; **to ~ against** əleyhinə ifadə vermək; **to ~ in favour of *smth.*** bir şeyin xeyrinə ifadə vermək; *The witnesses testified that they saw the robbery Şahidlər ifadə verdilər ki, onlar oğurluğu görüblər*; **2.** təntənəli surətdə elan etmək/məlumat vermək *(öz inamı, əqidəsi, etiqadı və s. barədə)*; **3.** sübut/təsdiq etmək; *Her tears testified her grief Göz yaşları onun dərdli olduğunu sübut edirdi*



**testimonial**[1] [ˌtestɪˈmounjəl] *n* **1.** xasiyyətnamə; zəmanət, zəmanət məktubu; **2.** kollektiv hədiyyə
**testimonial**[2] [ˌtestɪˈmounjəl] *adj* təşəkkür bildirən; tövsiyə edilən; ~ **dinner** şərəfə verilən ziyafət
**testimony** [ˈtestɪmənɪ] *n* **1.** şahid ifadəsi; **false** ~ yalan /yanlış ifadə; **to give** ~ ifadə vermək; *She gave testimony against the plaintiff O, iddiaçının əleyhinə ifadə verdi*; **2.** sübut, dəlil; *Nothing could refute her testimony that the driver was drunk Sürücünün sərxoş olması barədə onun verdiyi ifadəni heç nə ilə təkzib etmək olmazdı*; **3.** təsdiqlənmə; fikir; müddəa; iddia
**test-mixer** [ˈtestˌmɪksə$^r$] *n* menzurka *(maye ölçmək üçün dərəcələrə bölünmüş stəkan)*
**test-paper** [ˈtestˌpeɪpə$^r$] *n* **1.** reaktiv pambıq; reaktiv kağız; **2.** *amer.* imzanı tutuşdurmaq/yoxlamaq üçün istifadə olunan sənəd
**test pilot** [ˈtestˈpaɪlət] *n* sınaqçı təyyarəsürən, sınaq uçuşu keçirən təyyarəçi/təyyarəsürən
**test-tube** [ˈtesttju:b] *n* sınaq borusu/şüşəsi
**testy** [ˈtestɪ] *adj* tez hirslənən, tündməcaz, əsəbi, tündxasiyyət, hövsələsiz, acıqlı
**tetanic** [tɪˈtænɪk] *adj tib.* tetanus; ~ **microbe** tetanus mikrobu
**tetanus** [ˈtetənəs] *n* **1.** *tib.* tetanus *(yoluxucu xəstəlik)*; **2.** donuxma, quruyub/çaşıb qalma
**tetchy** [ˈtetʃɪ] *adj* küsəyən, tez küsən/inciyən, dəymədüşər; tez acıqlanan, tündməcaz; **a ~ horse** harın/köhlən at
**tête-à-tête**[1] [ˈteɪt a: ˈteɪt] *n fr.* **1.** üzbəüz/göz-gözə söhbət; **2.** məxsusi görüş *(iki nəfərin)*
**tête-à-tête**[2] [ˈteɪt a: ˈteɪt] *adj fr.* məxfi, məxsusi, xüsusi, şəxsi; xudmani; **a cosy ~ dinner** rahat xudmani nahar; *We had a tête-à-tête talk Biz şəxsi/məxfi söhbət etdik; He dined tête-à-tête with the Prime Minister O, baş nazirlə məxsusi nahar etdi*
**tether**[1] [ˈteðə$^r$] *n* **1.** ip, qayış, hörük *(otlayan heyvanı bağlamaq üçün)*; **2.** *məc.* hədd, hüdud; son hədd, son nöqtə; *I am at the end of my tether Mən daha dözmürəm, Mənim daha səbrim tükənib*
**tether**[2] [ˈteðə$^r$] *v* **1.** bağlamaq, bənd etmək, hörükləmək *(otlayan heyvanı)*; *He tethered his horse to the tree O, atını ağaca bağladı*; **2.** *məc.* məhdudlaşdırmaq; hədd/hüdud/sərhəd qoymaq
**tetragon** [ˈtetrəgən] *n hənd.* dördbucaq; **regular** ~ kvadrat
**tetragonal** [teˈtrægənəl] *adj hənd.* dördbucaqlı, çargül
**tetrahedron** [ˈtetrəˈhedrən] *n hənd.* tetraedr *(dördüzlü həndəsi cisim)*
**tetralogy** [teˈtrælədʒɪ] *n* tetralogiya *(ideya və məzmun cəhətdən bir vəhdət təşkil edən dörd əsər)*
**tetrameter** [teˈtræmɪtə$^r$] *n ədəb.* tetrametr *(dördbölgülü şer)*; mürəbbe; **iambic** ~ yamb *(vurğusu ikinci hecada olan şer vəznində)* formasında yazılmış tetrametr

**tetrastich** [ˈtetrəstɪk] *n ədəb.* beyt, qitə, bənd; dördsətirli şer
**tetrasyllable** [ˈtetrəˌsɪləbl] *n* dördhecalı söz
**tetter** [ˈtetə$^r$] *n tib.* dəmrov, ekzema *(dəri xəstəliyi)*; qoturluq
**Teuton** [ˈtju:tən] *n* tevton, german/alman tayfası
**Teutonic** [tju:ˈtɔnɪk] *adj:* qədim german; ~ **languages** qədim german dilləri; alman xalqları *(anqlo-sakson, german, skandinav və s.)*
**text** [tekst] *n* **1.** mətn, tekst; **to annotate a** ~ mətnə annotasiya yazmaq/qısa izahat vermək; **2.** mövzu; **to stick to *one's*** ~ mövzudan uzaqlaşmamaq; **3.** şrift *(mətbəədə)*
**textbook** [ˈtekstbuk] *n* dərslik, dərs kitabı
**textile**[1] [ˈtekstaɪl] *n* **1.** parça, qumaş; **2.** *pl:* **~s** toxunma mallar/parçalar
**textile**[2] [ˈtekstaɪl] *adj* toxuculuq; ~ **industry** toxuculuq sənayesi; *He works in the textile industry O, toxuculuq sənayesində işləyir/çalışır*; **a ~ worker** toxucu, toxuculuq sənayesi fəhləsi
**textual** [ˈtekstjuəl] *adj* **1.** mətn; ~ **errors** mətn səhvləri; ~ **criticism** tekstologiya *(mətnin tənqidi öyrənilməsi)*; **2.** mətnə tam uyğun, hərfiyyən; hərfi; ~ **translation** hərfi tərcümə; ~ **version** mətnə uyğun variant
**texture** [ˈtekstʃə$^r$] *n* **1.** *geol.* tekstura *(süxurların quruluşundakı xarici əlamətlər)*; **2.** quruluş; **the ~ of minerals** mineralların quruluşu; **3.** *anat. biol.* toxuma; **a skin of fine/coarse** ~ zərif/kobud toxumalı dəri; **4.** xüsusiyyət; faktura; əsas məzmun, məğz *(bədii incəsənət əsərində)*; **the ~ of verse** şerin fakturası/xüsusiyyəti/məziyyəti
**thallium** [ˈθælɪəm] *n kim.* tallium *(ağ rəngli yumşaq metal)*
**than** [ðæn, ðən, ðn] *conj* **1.** **-dan, -dən**; *I am taller than you Mən sən***dən***/siz***dən** *hündürəm*; **sooner ~ expected** gözlənildiyin**dən** tez; *I have never met anyone more stupid than you Mə sən***dən***/siz***dən** *səfeh/axmaq adama heç vaxt rast gəlməmişəm; That is easier said than done Demək iş görmək***dən** *asandır; I love you more than before Mən səni/sizi əvvəllər olduğun***dan** *daha çox sevirəm*; **2.** **-sa, -sə**; *Better late than never Heç olmamaqdan***sa**, *gec olmağı yaxşıdır; I would call it blue rather than green Mən onu yaşıldan***sa** *mavi adlandırardım*; **3.** **-ca, -cə**; *He knows better than to deceive me O yaxşı***ca** *bilir ki, məni aldatmaq olmaz; You should know better than to say that Sən/Siz yaxşı***ca** *bilməli idin/idiniz ki, bunu demək olmaz*; **4.** *müxtəlif mənalarda: He turned out to be none other than my brother Sən demə, o mənim qardaşım imiş; No sooner had I gone outside than it started to rain Mən heç bayıra çıxmamışdım ki, yağış yağmağa başladı; It was no other than my old friend John Kim olsa yaxşıdır? Mənim köhnə dostum Con; His failure was due to nothing else than his own carelessness Onun müvəffəqiyyətsizliyinə heç nə yox, özünün laqeydliyi səbəb oldu.*

*What he told you was nothing else than nonsense Onun sənə/sizə söylədikləri cəfəngiyyatdan başqa bir şey deyildi; I've seen her more than once Mən onu çox/bir neçə dəfə görmüşəm*

**thank** [θæŋk] *v* təşəkkür etmək, minnətdarlıq bildirmək; **to ~ someone for a gift** hədiyyəyə görə bir kəsə təşəkkür etmək; *We thanked her for her help Kömək etdiyinə görə biz ona təşəkkür etdik*; **to ~ sincerely** səmimi minnətdarlıq bildirmək/etmək; *Thank you very much Çox sağ ol/olun; He should thank his lucky stars that... O, taleyindən razı olmalıdır ki,...; There are no words to thank you enough Mən sənə/sizə o qədər minnətdaram ki, sözlə ifadə edə bilmirəm; Thank God! Allaha şükür!*

**thankful** [ˈθæŋkfl] *adj* minnətdar, yaxşılıq/qədir bilən, razılıq edən; **to be ~** 1) minnətdar olmaq; *We are thankful that you helped us Kömək etdiyinə/ etdiyinizə görə sənə/sizə minnətdarıq*; 2) Allaha şükür etmək; *You should be thankful to have escaped Xilas olduğuna/olduğunuza görə Allaha şükür etməlisən /etməlisiniz*

**thankless** [ˈθæŋklɪs] *adj* 1. naşükür, nankor, yaxşılıq / qədir bilməyən; 2. qiymətsiz, səmərəsiz, qoyulan zəhmətə dəyməyən; **a ~ task** səmərəsiz tapşırıq; **a ~ job** səmərəsiz/zəhmətinə dəyməyən iş

**thanks** [ˈθæŋks] *n pl* təşəkkür, razılıq, minnətdarlıq; *Please accept my thanks Zəhmət olmasa mənim təşəkkürümü qəbul et/edin; Thanks for coming Sağ ol/olun ki, gəlmisən/gəlmisiniz; Thank for the good advice Yaxşı məsləhət üçün sağ ol/olun; Many thanks! Çox sağ ol/olun!*; **~ to...** ...sayəsində, ...görə, ...köməyilə, ...üzündən, ...səbəbindən; *We completed this work on time thanks to your help Sənin/Sizin köməyin/ köməyiniz sayəsində biz bu işi vaxtında başa çatdırdıq; My team lost the match thanks to your inefficiency Sənin/Sizin bacarıqsızlığın/bacarıqsızlığınız üzündən mənim komandam oyunu uduzdu*

**thanksgiving[1]** [ˈθæŋks.gɪvɪŋ] *n* 1. razılıq/təşəkkür ifadə edən ibadət, şükran duası; 2. razılıq, təşəkkür, minnətdarlıq, şükranlıq

**thanksgiving[2]** [ˈθæŋks.gɪvɪŋ] *adj* şükranlıq; **Thanksgiving Day** *amer.* Şükranlıq günü *(hər il noyabrın sonuncu cümə axşamı qeyd olunan bayram)*

**thankworthy** [ˈθæŋk.wəːðɪ] *adj* təşəkkürə/razılığa layiq, razılıq/minnətdarlıq etməyə dəyən

**that[1]** [ðæt] *demon. pron. (pl* **those**) 1. o; **~ book** o kitab; **~ house** o ev; *That's what I came for Mən elə onun üçün gəlmişəm; I don't like that secretary of his Mənim onun katibindən/katibəsindən xoşum gəlmir*; **~ day** o gün; *That is true O həqiqətdir; I didn't mean that Mən onu demək istəmirdim*; 2. *İsmin əvəzində işlənir; The climate here is like that of France Buranın iqlimi Fransanın iqliminə bənzəyir*

**that[2]** [ðæt] *rel. pron. Bu halda* **that** *nisbi əvəzliyi Azərbaycan türkcəsinə tərcümə edilmir:* **the members ~ were present** iştirak edən üzvlər; **the book ~ I'm reading** mənim oxuduğum kitab; **the year ~ he died** onun rəhmətə getdiyi il; *Where is the book that I was reading? Mənim oxuduğum kitab haradadır?* **the company ~ bears his name** onun adını daşıyan şirkət; *He is not the man that he was O həmin/əvvəlki/həmişəki adam deyil; The letter that came this morning is from my father Səhər gələn məktub mənim atamdandır; The watch that you gave me is working perfectly Mənə verdiyin/ verdiyiniz saat əla işləyir*

**that[3]** [ðæt] *adv* elə, o qədər, o dərəcədə; *The man was that angry he couldn't say a word Kişi o dərəcədə/o qədər hirslənmişdi ki, heç bir söz də deyə bilmədi; I can't do that much Mən o qədər edə bilmərəm; I didn't know he was that rich Mən onun o qədər varlı olduğunu bilmirdim; This hall doesn't hold that many people Bu zal o qədər də çox adam tutmur; I can't walk that far Mən elə uzağa piyada gedə bilmərəm; It isn't all that cold Elə də soyuq deyil*

**that[4]** [ðæt] *conj Budaq cümlələrini baş cümləyə bağlayır:*...ki; *I admit that I was wrong Boynuma alıram ki, mən səhv etmişəm; She said that she would come O dedi ki, gələcək; It so happens that I know the man Belə çıxır ki, mən bu adamı tanıyıram; The trouble is that we are short of time Bəla burasındadır ki, bizim vaxtımız azdır; I will give up my claim so that you may have the property Mən öz iddiamdan əl çəkəcəm ki, sənin/sizin də mülkiyyətin/mülkiyyətiniz olsun; I came early so that I could find a place to park Tez gəldim ki, maşını saxlamağa yer tapa bilim; His behaviour was so bad that we all refused to receive him Onun davranışı elə pis idi ki, biz hamımız onu qəbul etməkdən imtina etdik; I ate so much that I was sick Mən o qədər yedim ki, xəstələndim; Supposing that it was true, how we should act Tutaq ki, bu doğru idi, onda biz necə hərəkət edərdik*

**thatch[1]** [θætʃ] *n* taxtapuş küləşi; qamış, qarğı

**thatch[2]** [θætʃ] *v* küləşlə/qamışla örtmək; *We thatched the roof Biz damı küləşlə/qamışla örtdük*

**thaw[1]** [θɔː] *n* 1. yumşaq/mülayim hava; 2. ərimə; *Let's go skating before a thaw sets in Gəl/Gəlin ərimə başlamamış sürüşməyə gedək (konki ilə)*; 3. istiləşmə, qızma; yumşalma *(münasibətlərdə)*

**thaw[2]** [θɔː] *v* 1. ərimək, donu açılmaq; *The snow in the garden is thawing Bağdakı qar əriyir*; 2. əritmək, donunu açmaq; **to leave frozen food to ~ before cooking it** bişirməmişdən qabaq dondurulmuş ərzağın donunu açmaq; 3. yumşalmaq, ürəyi açılmaq; səmimiləşmək; *After a bottle of wine he thawed out Bir şüşə şərabdan sonra o, cana gəldi; A good dinner with wine helped to thaw out our guests Şərabla verilən yaxşı nahar qonaqlarımızın ürəyini açdı*; 4. qızınmaq, qızışmaq; isinmək; *I sat by the fire to thaw out Qızınmaq üçün sobanın yanında oturdum*



**the** [ðə; ðiː] *müəyyənlik artikli:* 1. *İsimlərlə işlədilərək əşya və hadisələr sinfindən hər hansı predmeti, əşyanı, hadisəni ayırmağa xidmət göstərir: Bu halda the müəyyənlik artikli Azərbaycan türkcəsində: 1) təsirlik hal şəkilçilərinə* (**-ı, -i, -u, -ü**) *uyğun gəlir; Give me the book Kitabı mənə ver/verin; Put the pen on the table Qələmi stolun üstünə qoy/qoyun; Take the table from here Stolu buradan götür/götürün; Pour the milk into the jar Südü bardağa tök/tökün; 2) Tərcümə edilmir: The chair is in the room Stol otaqdadır; The book is in the bag Kitab çantanın içindədir; The children are in the yard Uşaqlar həyətdədir*; 2. *Haqqında danışılan əşya və ya şəxsin danışana məlum olduğunu bildirir; The man has come again Kişi yenə də gəlib; Where shall I put the table? Stolu hara qoyum?* 3. *Verilən əşya və ya şəxsin müstəsna, yaxud daha münasib olduğunu bildirir; Of all the men I know he is the man for the position Tanıdığım adamların hamısından bu vəzifə üçün o, ən layiqli adamdır*; **~ football player of the year** ilin (ən yaxşı) futbolçusu; 4. *Bir sinfə daxil olan isimləri ümumiləşdirir, onlardan birinə aid olan xüsusiyyətin həmin sinfin hər bir üzvünə aid olduğunu bildirir: The horse is a useful animal At faydalı heyvandır; The goat is a mammal Keçi məməlilər sinfindəndir*; 5. *Vahidlik anlayışlarını ifadə edir:* **the** sun günəş; **the** moon ay; **the** universe kainat, dünya; 6. *Substantivləşmiş sifətlərdə ümumiləşdirilmiş məna ifadə edir:* **the** poor kasıblar; **the** rich dövlətlilər; **the** wise müdriklər; **the** young gənclər, cavanlar; 7. *Sifətlərin qarşısında işlənərək taxəllüs və ya ləqəbin ifadə olunmasına xidmət edir:* Peter **the** Great **Böyük** Pyotr; Hasan **the** Long **Uzun** Həsən; Ivan **the** Terrible İvan **Qroznı**; 8. *Müqayisə dərəcəsindəki zərflərlə işlədilərək* **-sa, -sə** *şəkilçilərinə və* **nə qədər... o qədər...** *söz birləşməsinə uyğun gəlib eyni hadisə və ya şeyin bərabər şəkildə artması və ya azalmasını bildirir: The sooner the better* **Nə qədər** *tez olarsa,* **o qədər** *yaxşıdır; The more the better* **Nə qədər** *çox olarsa,* **o qədər** *yaxşıdır; The more he gets, the more he wants* **Nə qədər** *çox alırsa,* **o qədər** *də çox istəyir; The more he reads, the less he understands* **Nə qədər** *çox oxuyursa,* **o qədər** *az başa düşür*

**theater** [ˈθɪətəʳ] *n amer.* = **theatre**

**theatre** [ˈθɪətəʳ] *n* 1. teatr; **to go to the ~** teatra getmək; 2. auditoriya; 3. operasiya otağı; **operating ~** cərrahiyyə otağı; 4. meydan; **the ~ of war** hərbi əməliyyat meydanı, müharibə meydanı; 5. dramatik ədəbiyyat; pyeslər

**theatre-goer** [ˈθɪətə.gouəʳ] *n* teatr həvəskarı, teatra çox gedən adam

**theatrical[1]** [θɪˈætrɪkəl] *n* 1. peşəkar aktyor; 2. *pl* tamaşa, teatr tamaşası *(əsasən özfəaliyyət teatrı tamaşası)*

**theatrical[2]** [θɪˈætrɪkəl] *adj* 1. teatr; səhnə; **~ hall** teatr zalı; **~ play** səhnə əsəri; **~ column** qəzetdə teatra həsr olunan sütun; 2. *məc.* qeyri-təbii, süni; *She waved her hands in a theatrical way O, süni surətdə əllərini yellədi*

**theatricality** [θɪ.ætrɪˈkælɪtɪ] *n* qeyri-təbiilik, teatrallıq, sünilik

**theatricalize, -ise** [θɪˈætrɪkəlaɪz] *v* səhnələşdirmək, səhnəyə qoymaq

**theatrics** [θɪˈætrɪks] *n pl.* səhnə sənəti

**thee** [ðiː] *pron* **you** *şəxs əvəzliyinin arxaik forması*

**theft** [θeft] *n* oğurluq; **~ of government property** dövlət mülkiyyətinin oğurluğu; **to commit a ~** oğurluq etmək

**their** [ðeəʳ] *pron.* 1. onların; **~ mother /father** onların anası/atası; 2. *Bəzən Azərbaycan türkcəsinə tərcümə edilmir; They sold their house Onlar evlərini satdılar; They invited all their friends Onlar bütün dostlarını dəvət etdilər*

**theirs** [ðeəz] *poss. pron (yiyəlik əvəzliyinin mütləq forması)* onlarınkı; *This book is theirs Bu kitab onlarınkıdır*

**theism** [ˈθiːɪzəm] *n fəls.* teizm *(dünyanın Allah tərəfindən yaradılıb idarə edildiyini iddia edən ehkam)*

**theist** [ˈθiːɪst] *n fəls.* teist *(teizm tərəfdarı)*

**theistic** [θiːˈɪstɪk] *adj fəls.* teistik; teizm

**them** [ðem; ðəm] *pron.* **they** (onlar) *şəxs əvəzliyinin obyekt halı:* onlara, onları; *I saw them Mən onları gördüm; Give them the money Pulu onlara ver/verin; The girl went with them Qız onlarla getdi; Let them come Qoy/ Qoyun onlar gəlsinlər; There is a message from them Onlardan ismarış var*

**thematic** [θɪˈmætɪk] *adj* tematik *(mövzular üzrə)*; **~ catalogue** tematik kataloq; **~ plan** tematik plan, mövzular planı

**theme** [θiːm] *n* 1. mövzu, tema *(söhbətin, inşanın, müzakirənin və s.)*; **a contemporary ~** müasir mövzu; **dominant ~** üstünlük təşkil edən /əsas tema; 2. obyekt, məqsəd; **a ~ for discussion** müzakirə obyekti; 3. *qram.* əsas; 4. *mus.* tema; melodiya; **variations on a ~** bir mövzuda variasiyalar

**theme song** [ˈθiːmsɔŋ] *n mus.* təkrarlanan tema, melodiya

**themselves** [ðəmˈselvz] *ref. pron* 1. özlərinə; özlərini; *They have built themselves a house Onlar özlərinə ev tikiblər; They behavioured themselves badly Onlar özlərini pis apardılar; They cannot agree among themselves Onlar öz aralarında razılığa gələ bilmirlər; They talked among themselves Onlar öz aralarında danışdılar*; 2. onlar özləri; *They don't know themselves Onlar heç özləri də bilmirlər; They built it themselves Onlar bunu özləri tikdilər*

**then[1]** [ðen] *adj* o vaxtkı, o zamankı, ondakı; **the ~ President** o zamankı prezident; **the ~ ruling party** o vaxtkı hakim partiya; **the ~ Prime Minister** o zamankı baş nazir

**then²** [ðen] *adv* **1.** onda, o vaxt, o zaman; *We were young then Onda biz cavan idik; Where were you living then? O vaxt sən/siz harada yaşayırdın/ yaşayırdınız?* **2.** sonra; ondan sonra; *First we went to London and then to Paris Biz əvvəlcə Londona, sonra isə Parisə getdik;* **3.** onda; o halda, belə olan surətdə; *If you are tired then you'd better stay at home Əgər sən/siz yorğunsansa/yorğunsunuzsa, onda yaxşı olar ki, evdə qalasan/qalasınız; What will you do then? Belə olan surətdə nə edərsən/ edərsiniz?* **4.** ondan başqa; bundan əlavə; *And then, you must remember... Bundan başqa, yadda saxlamalısan/saxlamalısınız ki,...; I love my job and then it pays so well Mən öz işimi sevirəm və bir də ki, yaxşı maaşı var; Then there's Mrs Green – she must be invited to the wedding Bundan başqa, Qrin xanım da var – onu da toya dəvət etməkgərəkdir/o da toya dəvət olunmalıdır;* **5.** deməli; *Then you're not coming Deməli, sən/siz gəlmirsən/gəlmirsiniz;* **by ~** o vədəyəcən; **since ~** o vaxtdan/o zamandan bəri; **now and ~** vaxtaşırı; hərdənbir; **till ~** o vaxtadək, o zamana qədər

**thence** [ðens] *adv* **1.** oradan; *We flew to Boston and thence to Washington Biz Bostona, oradan da Vaşinqtona uçduq;* **2.** o vaxtdan/o zamandan bəri; **3.** buradan, bu səbəbdən; bunun üzündən, buna görə (də), deyilənlərdən; *It follows, thence, that... Deyilənlərdən belə çıxır ki,...*

**thenceforth** [ˈðensˈfɔ:θ] *adv* o vaxtdan bəri, o vaxtdan, o zamandan; bundan belə, ondan sonra

**thenceforward** [ˈðensˈfɔ:wəd] *adv* = **thenceforth**

**theocracy** [θɪˈɔkrəsɪ] *n* teokratiya *(siyasi hakimiyyətin ruhanilər əlində olan idarə üsulu)*

**theocratic** [θɪəˈkrætɪk] *adj* teokratik; **~ system** teokratik quruluş/sistem

**theodolite** [θɪˈɔdəlaɪt] *n geol.* teodolit *(bucaqölçən alət)*

**theologian** [θɪəˈloudʒjən] *n* ilahiyyatçı *(ilahiyyat mütəxəssisi; ruhani məktəbi tələbəsi)*

**theological** [θɪəˈlɔdʒɪkəl] *adj* ilahiyyat; **~ seminary/ school** ruhani seminariyası/məktəbi

**theology** [θɪˈɔlədʒɪ] *n* ilahiyyat *(dini nəzəriyyə)*, din elmi

**theorem** [ˈθɪərəm] *n* teorem

**theoretic** [θɪəˈretɪk] *adj* nəzəri

**theoretical** [.θɪəˈretɪkl] *adj* = **theoretic**

**theoretically** [.θɪəˈretɪkəlɪ] *adv* nəzəri, nəzəri cəhətdən/ baxımdan/olaraq

**theoretician** [.θɪəreˈtɪʃn] *n* nəzəriyyəçi

**theoretics** [θɪəˈretɪks] *n pl* nəzəriyyə

**theorist** [ˈθɪərɪst] *n* nəzəriyyəçi

**theorize, -ise** [ˈθɪəraɪz] *v* nəzəri mühakimə yürütmək; nəzəri məsələlərlə məşğul olmaq

**theory** [ˈθɪərɪ] *n* **1.** nəzəriyyə; **to advance/to propose a ~** nəzəriyyə irəli sürmək, nəzəriyyə təqdim etmək; **to confirm a ~** nəzəriyyəni təsdiq etmək; **to test a ~** nəzəriyyəni yoxlamaq; **to develop a ~** nəzəriyyəni inkişaf etdirmək; **in ~** nəzəriyyədə, nəzəri olaraq; **to combine ~ and practice** nəzəriyyə ilə təcrübəni birləşdirmək; *They proceeded on Darwin's theory of evolution Onlar Darvinin təkamül nəzəriyyəsindən çıxış etdilər;* **2.** fərziyyə; ehtimal; güman; *He has a theory that wearing hats makes men bald Onun fərziyyəsinə görə papaq geymək kişilərin saçını tökür; My theory is that... Güman/Fərz edirəm ki,..*

**theosophical** [.θɪəˈsɔfɪkl] *adj fəls.* təsəvvüf, təsəvvüfi

**theosophist** [.θɪəˈsɔfɪst] *n fəls.* mütəsəvvüf, sufi, təsəvvüfçü

**theosophy** [θi:ˈɔsəfɪ] *n fəls.* təsəvvüf, sufilik

**therapeutic** [.θerəˈpju:tɪk] *adj tib.* terapevt *(terapiya)*; daxili xəstəliklər

**therapeutics** [.θerəˈpju:tɪks] *n pl (Cəm formada olub təkdə işlənir) tib.* terapiya **(1)** daxili xəstəliklərin müalicəsi; **2)** tibb elminin daxili xəstəliklərin müalicəsindən bəhs edən şöbəsi)

**therapeutist** [.θerəˈpju:tɪst] *n tib.* terapevt, can həkimi

**therapist** [ˈθerəpɪst] *n tib.* fizioterapevt; psychotherapist psixoterapevt *(psixoterapiya mütəxəssisi olan həkim)*; **speech ~** loqoped *(danışıq qüsurunun müalicəsi ilə məşğul olan həkim)*

**therapy** [ˈθerəpɪ] *n* terapiya, müalicə; **physical ~** fizioterapiya; **speech ~** loqopediya *(nitq qüsurlarını öyrənən və müalicəsindən bəhs edən elm)*; **to be in ~** müalicə olunmaq; *She is in therapy O, müalicə olunur*

**there** [ðeə] *adv* **1.** orada; *Who lives there? Orada kim yaşayır?* **2.** ora, oraya; **~ and back** ora və geriyə, ikibaşa *(məs. ikibaşa bilet)*; **3.** oradan; *He has left there O oradan çıxıb gedib;* **4.** burada, bu yerdə; *I disagree with you there Burada mən səninlə/sizinlə razı deyiləm; You've got me there! Burada sən/siz məni dolaşdırdın/ dolaşdırdınız!;* **5.** burada, bununla; *He didn't stop there O, bununla dayanmadı; The matter didn't end there Məsələ bununla qurtarmadı;* **6.** odur orada, odur ey; budur bax; bax bu, bax odur *(diqqəti cəlb etmək üçün işlədilir); There he comes! Budur ey, o gəlir!* **over ~** bax, orada; **~ and then** buradaca, dərhal, həmin; **7.** *formal söz kimi:* **to be** *feli ilə birgə "var", "olar" mənalarını ifadə edir; There is reason to believe that... İnanmağa əsas vardır ki,...; There is nothing there Orada heç nə yoxdur; There is nothing I can do Mən heç nə edə bilmərəm; There is no stopping him Onu saxlamaq olmaz, Onu saxlaya bilməzsən; There was no one there Orada heç kim yox idi; There were three of them Onlar üç nəfər idilər*

**thereabout(s)** [ˈðeərəbaut(s)] *adv* yaxında, oralarda, o tərəflərdə, yaxınlığında; təxminən; *He lives in London or thereabout O, Londonda və yaxud onun yaxınlığında yaşayır; 40 guests*



*came or thereabouts 40 nəfər və ya 40 nəfərə yaxın qonaq gəldi*

**thereafter** [ðeəˈa:ftəʳ] *adv* ondan/bundan sonra; o vaxtdan; gələcəkdə

**thereby** [ˈðeəˈbaɪ] *adv* beləliklə, bu surətdə, belə olan surətdə; bununla əlaqədar; *Thereby hangs a tale Buna bəzi şeyləri əlavə etmək olar; Bununla əlaqədar bəzi şeyləri danışmaq olar*

**therefore** [ˈðeəfɔ:] *adv* buna görə, bunun üçün, bu səbəbə/səbəbdən; odur ki; demək, deməli; beləliklə; *We missed the bus; therefore, were late Biz avtobusa çatmadıq; ona görə də/bu səbəbdən də gecikdik*

**therefrom** [ðeəˈfrɔm] *adv d.d.* oradan

**therein** [ðeərˈɪn] *adv d.d.* **1.** bununla; burada; ora, oradakı; **the earth and all ~** yer kürəsi və orada olanların hamısı; **2.** bu cəhətdən

**thereof** [ðeərˈɔv] *adv d.d.* hamısını, orada olanın hamısı; *I lifted the cup and drank thereof Fincanı /Qədəhi qaldırdım və hamısını içdim*

**thereon** [ðeərˈɔn] *adv d.d.* bununla; bundan sonra, bunun ardınca

**thereto** [ðeəˈtu:] *adv* bundan başqa, bununla yanaşı

**therewith** [ðeəˈwɪθ] *adv* **1.** bununla yanaşı, bununla; **2.** dərhal, həmən saat, tez, təxirəsalmadan, təcili

**thermal** [ˈθə:məl] *adj* **1.** termik, istilik; **~ energy** istilik enerjisi; **~ power station** istilik elektrik stansiyası; **2.** isti, qaynar; **~ springs** qaynar/isti bulaqlar; **~ capacity** *fiz.* istilik tutumu; **~ conductivity** istilikkeçirmə xassəsi; **~ unit** istilik vahidi

**thermic** [ˈθə:mɪk] *adj* istilik, termik

**thermit(e)** [ˈθə:mɪt] *n kim.* termit *(yanarkən çox şiddətli hərarət verən tozşəkilli maddə)*

**thermochemistry** [ˈθə:mouˈkəmɪstrɪ] *n kim.* termokimya *(kimyanın kimyəvi reaksiyaların törətdiyi istilik hadisələrini tədqiq edən şöbəsi)*

**thermodynamics** [ˈθə:moudaɪˈnæmɪks] *n pl fiz. (Cəm formada olmasına baxmayaraq təkdə işlənir)* termodinamika *(fizikanın hərarət və onun başqa enerji növlərinə çevrilməsindən bəhs edən şöbə)*

**thermo-electric** [ˈθə:mouɪˈlektrɪk] *adj* termoelektrik

**thermo-electricity** [ˈθə:mouɪlekˈtrɪsɪtɪ] *n* termoelektrik

**thermograph** [ˈθə:mougra:f] *n* termoqraf *(hərarətin dəyişməsini öz-özünə yazan cihaz)*

**thermometer** [θəˈmɔmɪtəʳ] *n* termometr, istilikölçən

**thermonuclear** [ˈθə:mouˈnju:klɪəʳ] *adj* istilik-nüvə; **~ weapon** istilik-nüvə silahı; **~ bomb** hidrogen bombası

**thermopile** [ˈθə:moupaɪl] *n* termoelement

**thermoplegia** [ˈθə:mouˈpli:dʒɪə] *n tib.* gün vurma

**thermos** [ˈθə:mɔs] *n* termos *(həm də* **~ bottle /flask/jug)**

**thermostable** [.θə:mouˈsteɪbl] *adj* istiyədavamlı, hərarətədavamlı

**thermostat** [ˈθə:məstæt] *n* termostat *(müxtəlif şeyləri sabit temperaturda saxlamaq üçün cihaz)*

**thermotechnics** [ˈθə:mouˈteknɪks] *n pl (formaca cəm olmasına baxmayaraq təkdə işlənir)* istilik texnikası

**thesaurus** [θɪˈsɔ:rəs] *n* **1.** tezarus *(məna oxşarlıqlarına görə qruplaşdırılmış söz və ifadələr lüğəti)*; **2.** *məc.* xəzinə; anbar

**these** [ði:z] *pron* **(this** *işarə əvəzliyinin cəm forması)* bunlar; bu; **~ houses** bu binalar; *These are my children Bunlar mənim uşaqlarımdır;* **one of ~ days** bu günlərdə

**thesis** [ˈθi:sɪs] *n (pl* **-ses) 1.** tezis; əsas fikir; müddəa; **2.** dissertasiya; **3.** inşa/oçerk mövzusu

**thespian¹** [ˈθespɪən] *n* dramatik aktyor və ya aktrisa

**thespian²** [ˈθespɪən] *adj ədəb.* dramatik, faciəvi, faciəli; tragediyalarda oynayan

**theurgy** [ˈθi:ə:dʒɪ] *n* sehrbazlıq, cadugərlik, ovsunçuluq; sehr, cadu, ovsun

**thews** [θju:z] *n pl* **1.** əzələlər; **2.** əzələ quvvəsi; **3.** zəkanın/ağılın gücü

**they** [ðeɪ] *pron.* onlar; *They went Onlar getdilər; Put the keys back where they were Açarları qaytarıb yerinə qoy/qoyun; They say it can't happen Deyirlər ki, belə şey ola bilməz*

**thick¹** [θɪk] *n* **1.** qalınlıq, sıxlıq, cəngəllik, sıx yer *(meşədə)*; **in the ~ of the forest** meşənin qalınlığında, cəngəllikdə; **2.** orta, mərkəz, ara, iç; **in the ~ of it** lap mərkəzində/içində *(hadisələrin və s.)*; **3.** qızğın çağ/vaxt; **in the ~ of the fight** döyüşün qızğın çağında/vaxtında; **through ~ and thin** təkidlə; maneələrə baxmayaraq

**thick²** [θɪk] *adj* **1.** qalın; yoğun; **a ~ carpet** qalın xalça; **a ~ book** qalın kitab; **2.** qara; **~ print** qara şrift; **of ~ lines** qara sətirlərlə; **3.** sıx, qatı; **~ hair** sıx saç; **~ forest** sıx meşə; **~ fog** qatı duman; **~ soup** qatı sup; *The air was thick with smoke Havanı qatı tüstü bürümüşdü;* **4.** sıx-sıx, dalbadal; *The air was thick with insults Dalbadal təhqirlər yağırdı;* **~ shower of blows** dolu kimi yağan zərbələr; **5.** bulanıq *(maye haq.)*; **6.** boğuq, xırıltılı, batıq, tutqun; **a ~ voice** boğuq/xırıltılı səs; **in a ~ voice** xırıltılı səslə; **7.** *d.d.* səfeh; qanmaz, korazehin; *He is pretty thick O lap kütbeyindir/qanmazdır;* **8.** yaxın, ayrılmaz; *They are very thick Onlar ayrılmaz/səmimi dostdurlar;* **9.** anlaşılmaz, aydın olmayan, yaxşı eşidilməyən; *The patient's speech is still quite thick Xəstə hələ də tam anlaşılmaz tərzdə danışır; That is a bit/too thick! Bu lap ağ oldu!*

**thick³** [θɪk] *adv* **1.** qalın, qalın-qalın; bol; *Don't put the paint on too thick Boyanı çox qalın sürtmə/ sürtməyin; He cut the bread thick O, çörəyi qalın-qalın doğradı;* **2.** tez-tez; sıx-sıx; **3.** anlaşılmaz; kəkələyə-kəkələyə; **to speak ~** anlaşılmaz/ kəkələyə-kəkələyə danışmaq

**thicken** ['θıkən] *v* **1.** qalınlaşdırmaq, yoğunlaşdırmaq; qalınlaşmaq, yoğunlaşmaq; **2.** qatılaşdırmaq, qəlizləşdirmək; qatılaşmaq, qəlizləşmək, laxtalanmaq; *The fog is thickening Duman qatılaşır; Whip the cream until it thickens Xamanı qatılaşanadək çal/çalın*; **3.** sıxlaşdırmaq, sıxlaşmaq; **4.** bulanmaq, tutqunlaşmaq; **5.** çoxalmaq, artmaq; sıxlaşmaq; **6.** mürəkkəbləşmək, çətinləşmək, ağırlaşmaq; *The plot thickens Süjet mürəkkəbləşir*

**thicket** ['θıkıt] *n* qalın meşə, sıx meşəlik, cəngəllik

**thickhead** ['θıkhed] *n* küt, korazehin, kütbeyin *(adam)*

**thick-headed** ['θık'hedıd] *adj* küt, korazehin, kütbeyin, qanmaz

**thickness** ['θıknıs] *n* **1.** qalınlıq, yoğunluq; **one metre in ~** bir metr qalınlığında; **2.** sıxlıq, kiplik; **3.** qat, lay, təbəqə; **three ~es of material** üç qat parça/qumaş

**thickset** ['θık'set] *adj* **1.** iri və möhkəm köklü; **2.** sıx əkilmiş; **~ trees** sıx əkilmiş ağaclar; **3.** möhkəm, yoğun; **4.** *məc.* pota *(adam)*

**thick-skinned** ['θık'skınd] *adj məc.* gönüqalın, kobud, qaba, hissiz; **a ~ man** gönüqalın adam

**thick-skulled** ['θık'skʌld] *adj* səfeh, axmaq, sarsaq, başıboş, qanmaz, yelbeyin, küt

**thief** [θi:f] *n (pl* **thieves***)* oğru; *Stop the thief! Oğrunu tut/tutun!*; **gang of thieves** oğru dəstəsi, banda;

◊ **to set a ~ to catch a ~** oğrunu tutmağı oğruya tapşırmaq; ≅ qoyunu qurda tapşırmaq

**thieve** [θi:v] *v* oğurlamaq, oğurluq etmək

**thievery** ['θi:vərı] *n* **1.** oğurluq; **2.** oğurluq mal /şey

**thievish** ['θi:vıʃ] *adj* **1.** əliəyri, əliuzun; **2.** hiyləgər, bic

**thievishly** ['θi:vıʃlı] *adv* **1.** oğrun-oğrun; **to look ~** oğrun-oğrun baxmaq; **2.** şərəfsizcəsinə, arsızcasına, abırsızlıqla

**thigh** [θaı] *n* omba, bud

**thigh-bone** ['θaıboun] *n* omba /bud sümüyü

**thill** [θıl] *n* dişlə, əskeş

**thimble** ['θımbl] *n* **1.** üskük, oymaq; **2.** ucluq; **3.** *tex.* halqa, mufta

**thimbleful** ['θımblful] *n* **1.** udum, qurtum; **2.** bir çimdik; **~ of salt** bir çimdik duz; **3.** damcı; **~ of water** dir damcı su

**thin**[1] [θın] *adj* **1.** nazik, incə, zərif; **~ ice** nazik buz; **~ line** nazik xətt; **~ waist** nazik bel; **~ shirt** nazik köynək; **2.** arıq, sısqa; *She has got very thin O çox arıqlayıb*; **~ as a lath/a rail** yonqar /taləşa kimi arıq; **rather ~ in the face** üzdən/sifətdən xeyli arıq; *Your illness has left you very thin Xəstəlik səni/sizi çox arıqladıb*; **3.** seyrək, tək-tük; az; *His hair is getting thin Onun saçları seyrəlir*; **a ~ forest** seyrək meşə; **~ air** seyrək hava; **a ~ crowd** seyrək izdiham; *The audience is a bit thin Camaat bir qədər azdır; Doctors are thin on the ground here Buralarda həkimlər azdır*; **4.** duru; **~ soup** duru sup/şorba; **5.** zəif, miskin; ucuz; **a ~ plot** zəif süjet; **a ~ humour** ucuz/zəif yumor; **~ story** zəif hekayə; **6.** əsassız, tutarsız, səbatsız; **a ~ excuse** tutarsız bəhanə; **7.** *d.d.* pis, çirkin; xoşagəlməz; **to have a ~ time** pis vaxt keçirmək;

◊ *That is too thin Bu, açıq görünür,* ≅ *Xoruzun quyruğu görünür*

**thin**[2] [θın] *v* **(-nn-) 1.** arıqlamaq *(həm də* **to ~ down***)*; **2.** naziltmək; incələşdirmək; itiləmək, nazikləşdirmək; **3.** *(həm də* **to ~ out***)* seyrəltmək, seyrəkləşdirmək; *He thinned the seedlings O, şitilləri seyrəltdi*; **4.** *(həm də* **to ~ out***)* azalmaq, seyrəlmək, seyrəkləşmək; *We had better wait until the fog thins out Biz duman seyrələnəcən gözləsək yaxşıdır; The crowd have thinned out İzdiham/ Camaat seyrəlib*; **5.** boşalmaq; tənhalaşmaq; **6.** köhnəlmək, süzülmək, dağılmaq *(paltar, geyim və s.)*; sürtülmək, yeyilmək *(rəng, boya və s.)*; **7.** *məc.* zəifləmək, taqətdən /əldən düşmək, üzülmək; tükənmək *(səbir və s.)*

**thin**[3] [θın] *adv* nazik, incə, incəliklə; *You've spread the butter very thin Sən/Siz yağı lap nazik yaxmısan/ yaxmısınız*

**thing** [θıŋ] *n* **1.** şey, əşya, predmet, cisim; *What do you call this thing? Sən/Siz bu şeyi necə adlandırırsan/ adlandırırsınız? I haven't a thing to wear Mənim geyməyə bir şeyim yoxdur; I like pretty things Yaxşı şeylər mənim xoşuma gəlir*; **2.** *pl* şeylər *(şəxsi)*, əşyalar, paltarlar; *Have you packed your things for the journey? Sən/Siz səfərə çıxmaq üçün şeylərini/şeylərinizi qablaşdırmısanmı/ qablaşdırmısınızmı? Put away your things Şeylərini/ Şeylərinizi yığışdır/yığışdırın*; **3.** iş, fakt; şərait; hadisə; *It is a strange thing! Qəribə işdir! Then another thing happened Sonra daha bir hadisə baş verdi; I have a number of things to do Mənim görüləsi bir aləm işim var; Things look promising Vəziyyət ümidverici görünür; How are things? d.d. İşlər necədir?* **all ~s considered** bütün cəhətləri/hər şeyi nəzərə alaraq; *That only makes things worse Bu, yalnız vəziyyəti daha da pisləşdirir; You take things too seriously Sən/Siz məsələləri lap ciddi qəbul edirsən/edirsiniz; Things are getting worse and worse İşlər getdikcə daha da pisləşir*; **4.** ləvazimat, avadanlıq; **tea ~s** çay ləvazimatı; **5.** ədəbi-bədii və yaxud musiqi əsəri; hekayət; **6.** məxluq, vücud, insan; heyvan; *Poor thing! Yazıq! Zavallı!* **dumb ~s** dilsiz-ağızsız heyvanlar; **7.** lüzumlu/ əhəmiyyətli/ münasib şey; *It is just the thing Bu elə mən deyəndir; A good rest is just the thing for you Yaxşı istirahət sənə/sizə hər şeydən vacibdir*;

◊ *The main thing is ... Başlıcası budur ki,...;* **the same ~** eyni şey; *It's a good thing (that)... Yaxşı ki,...; Such a thing could not happen here Burada belə şey ola bilməz; It comes to the same thing Fərqi yoxdur, Hamısı birdir; It amounts to the same thing Fərqi yoxdur, Eyni şeydir*; **to see ~s** sayıqlamaq, sərsəmləmək; **to know a ~ or two** başı çıxmaq, bilmək; *He knows a thing or two about cars Onun maşından başı çıxır*; **to make a good ~ of** ***smth.*** bir şeydən hasil etmək/ fayda götürmək; *Too much of a good thing! Bu lap ağ oldu!*

**think** [θıŋk] *v (pt, pp* **thought** [θɔ:t]**) (about, of) 1.** düşünmək, fikirləşmək; *I'll think about it Mən bu barədə düşünərəm/fikirləşərəm; I don't think so Mən belə düşünmürəm*; **to ~ logically** məntiqi düşünmək; **2.** düşünüb/ fikirləşib tapmaq; *I cannot think of the right word Mən fikirləşib münasib söz tapa bilmirəm*; **the ability to ~** düşünmək qabiliyyəti; *Who would have thought of it? Bu kimin ağlına gələrdi?* **3.** hesab etmək, saymaq; güman/zənn etmək; *I think no harm in it Mən burada zərərli bir şey görmürəm; So you think it can't be done Deməli, sən /siz hesab edirsən/ edirsiniz ki, bu, mümkün deyil; I think her charming Mən onu füsunkar hesab edirəm; He thinks himself very clever O özünü çox ağıllı hesab edir; People will think you're crazy Camaat elə bilər (ki) dəlisən/dəlisiniz; I think he's wrong Məncə, o səhv edir*; **4.** başa düşmək, anlamaq; təsəvvür etmək, təsəvvürə gətirmək; *I can't think where he might be Təsəvvür edə bilmirəm ki, o harada ola bilər*; **5.** gözləmək; təxmin/fərz/ehtimal/zənn etmək, fikrində tutmaq; *I thought as much Mən elə belə də gözləyirdim; They think they can come Onlar elə zənn edirlər, gələ bilərlər*; **6.** yada salmaq, xatırlamaq, yad etmək, anmaq; *I can't think of her name Onun adını yadıma sala bilmirəm; I'll think of it in a minute İndicə yadıma salaram; One can't think of everything Hər şeyi yadda saxlamaq/ xatırlamaq mümkün deyil*; **7.** daima fikirləşmək; xəyal etmək, xülyaya qapılmaq; **8.** fikrində tutmaq; *Think of a number/figure Fikrində/Fikrinizdə bir rəqəm tut/tutun*; **9.** uydurmaq, fikirləşib tapmaq; *What will he think of next? O sonra nə uyduracaq? I couldn't think of anything to say Mən deməyə bir şey fikirləşib tapa bilmədim; Don't worry, we'll think of something Narahat olma/olmayın, bir şey fikirləşib taparıq*; **to ~ out/through** ölçüb-biçmək, ətraflı fikirləşmək, götür-qoy etmək; **to ~ over** düşünmək, götür-qoy etmək;

◊ **to ~ much of** (özü) haqqında çox böyük fikirdə olmaq, özündən bədgüman olmaq; **to ~ no end of** ***smb.*** bir kəsi çox yüksək qiymətləndirmək; **to ~ better of** ***smb.*** bir kəs haqqında yaxşı fikirdə olmaq; *I think little (or nothing) of 30 miles a day Mənim üçün gündə 30 mil qət etmək nadir ki (çox asandır)*; **to ~ twice** hərtərəfli götür-qoy etmək/fikirləşmək



**thinkable** ['θıŋkəbl] *adj* mümkün olan, ağlasığan, ağlabatan

**thinker** ['θıŋkə[r]] *n* mütəfəkkir

**thinking**[1] ['θıŋkıŋ] *n* **1.** təfəkkür; **way of ~** təfəkkür/düşüncə tərzi; **revolution in ~** şüurda /zehində inqilab; **2.** rəy, fikir, təsəvvür; **to my way of ~** məncə, mənim fikrimcə; *I brought him round to my way of thinking Mən onu öz fikrimlə razılaşdırdım*

**thinking**[2] ['θıŋkıŋ] *adj* fikirləşən, düşünən; **all ~ people** bütün düşünən insanlar

**think piece** ['θıŋk'pi:s] *n d.d.* icmal məqaləsi *(qəzetdə, jurnalda)*

**thinly** ['θınlı] *adv* **1.** nazik; **~ sliced bread** nazik doğranmış çörək; **2.** incə, incəliklə; **3.** seyrək; **to sow the seeds ~** toxumu seyrək səpmək; **~ populated area** əhalisi seyrək olan ərazi; **4.** çətinliklə, güclə, zorla; az qala, demək olar ki; **~ veiled threat** güclə gizlədilən hədə-qorxu

**thin-skinned** ['θın'skınd] *adj* **1.** nazikqabıq, qabığı nazik *(meyvə haq.)*; **2.** küsəyən, tez küsən /inciyən, dəymədüşər

**third**[1] [θə:d] *n* **1.** üçdə bir hissə; **2.** *mus.* tersiya *(diatonik qammanın üçüncü pilləsi)*

**third**[2] [θə:d] *num* üçüncü; **the ~ person** üçüncü şəxs; **the ~ month of the year** ilin üçüncü ayı; **Edward the Third** III Edvard; **the ~ party** *hüq.* üçüncü tərəf; **in the ~ place** üçüncü yerdə; **the Third World** inkişaf etməkdə olan və bloklara qoşulmayan ölkələr

**third class** ['θə:d'kla:s] *adv* üçüncü dərəcəli, üçüncü qrup

**thirdly** ['θə:dlı] *adv* üçüncüsü

**third-rate** ['θə:d'reıt] *adj* bekara, pis; üçüncü dərəcəli/növ/sort

**thirst**[1] [θə:st] *n* **1.** susuzluq, susama, yanğı; *They lost their way in the desert and died of thirst Onlar səhrada azdılar və susuzluqdan öldülər*; **to experience ~** susuzluq çəkmək/keçirmək; **to quench ~** susuzluğu yatırmaq; **unquenchable ~** yatırılmaz/sönməz susuzluq, kəsilməz yanğı; **2.** *məc.* coşğun həvəs/arzu, ehtiras; **a ~ for fame** şöhrət həvəsi/ehtirası; **a ~ for knowledge** bilik qazanmaq ehtirası/həvəsi

**thirst**[2] [θə:st] *v* **1.** susamaq, susuzluqdan yanmaq; **2.** *məc.* çox arzu etmək/istəmək; həsrət çəkmək, həsrətində olmaq

**thirsty** ['θə:stı] *adj* **1.** susayan, susuzluq hiss edən; su içmək istəyən; *I am thirsty Mən susamışam; Some kinds of food make one thirsty Bəzi yeməklər adamı susadır*; **2.** *məc.* ehtirasla arzu edən, həsrətində olan; **~ for power** hakimiyyət həsrətində olan; **3.** quru, qupquru, susuz *(torpaq haq.)*; **~ fields** susuz/quru çöllər; *The fields are thirsty for rain Çöllər yağış həsrətindədir*

**thirteen** ['θə:'ti:n] *num.* on üç; *There were thirteen children in the room Otaqda 13 uşaq vardı*

**thirties** ['θə:tɪz] *n pl* **1.** **(the ~)** otuzuncu illər; **2.** yaş *(30 və 39 arası); She is just out of her thirties O təzəcə qırx yaşına keçib*
**thirtieth** ['θə:ti:θ] *num.* otuzuncu; **the ~ row** otuzuncu cərgə/sıra
**thirty** ['θə:tɪ] *num.* otuz; *He is over thirty Onun yaşı otuzdan çoxdur/otuzu keçib*
**this** [ðɪs] *demon. pron (pl* **these***)* bu; **~ house** bu ev; **~ place** bu yer; **~ month** bu ay; **~ year** bu il; **~ minute** bu dəqiqə; **~ time last year** keçən il bu vaxtı; **~ new watch of mine** mənim bu təzə saatım; *This Wednesday I am busy Bu çərşənbə mən məşğulam; What floor is this? Bu hansı mərtəbədir? Whose pen is this? Bu kimin qələmidir? What is this? Bu nədir? This is what I think Mənim düşündüyüm budur; This will never do Bu heç cürə yaramaz;* **to talk about ~ and that** ordan-burdan danışmaq; **like ~** belə, beləcə, beləliklə; *Copy down this rule Bu qaydanı köçür/ köçürün*
**thistle** ['θɪsl] *n bot.* qanqal
**thistle-down** ['θɪsldaun] *n* qanqal toxumlarının tiftiyi; tiftik, zərif tük;
◊ **as light as ~** pərqu kimi yüngül
**thistly** ['θɪslɪ] *adj* **1.** qanqal basmış, qanqallı; **2.** tikanlı; kəskin
**thither** ['ðɪðə^r] *adv d.d.* ora, oraya; o tərəfə, o yana, o başa; **hither and ~** ora bura; o tərəfə, bu tərəfə; həm o yana, həm bu yana
**thitherto** ['ðɪðə'tu:] *adv d.d.* o vaxta kimi/qədər, o vaxtacan
**thitherward(s)** ['ðɪðəwəd(z)] *adv d.d.* ora, oraya; o tərəfə, o yana, o başa
**thole** [θoul] *n* avar yeri *(qayıqda)*
**thole-pin** ['θoulpɪn] *n* = **thole**
**thong**[1] [θɔŋ] *n* **1.** qayış, kəmər, toqqa; **2.** şallaq, qamçı
**thong**[2] [θɔŋ] *v* qamçılamaq, şallaqlamaq
**thoraric** ['θɔ:rærɪk] *adj anat.* döş, əmcək; köks, sinə; **~ duot** *anat.* döş kanalı
**thorax** ['θɔ:ræks] *n pl* **(thoraxes** *və ya* **thoraces** [θɔ:rəsi:z]) *anat.* döş qəfəsi
**thorium** ['θɔ:rɪəm] *n kim.* torium *(kimyəvi element)*
**thorn** [θɔ:n] *n* **1.** tikan; **to remove a ~ from one's finger** barmağından tikan çıxartmaq; **2.** tikanlı bitki;
◊ **a ~ in smb.'s side/flesh** bir kəsin başının daşı, bir kəsə daim mane olan şey; *That debt has been a thorn in my side for years O borc illərlə mənim başımın daşı olub*
**thorn-apple** ['θɔ:n.æpl] *n bot.* **1.** dəlibəng *(zəhərli bitki)*; **2.** *məc.* zəhər, tiryək
**thorny** ['θɔ:nɪ] *adj* **1.** tikanlı; **a ~ bush/tree** tikanlı kol/ağac; **2.** ağır, çətin, əzablı; **~ path** çətin/ağır yol; **a ~ problem** çətin problem; **3.** ziddiyyətli, bir-birinə düz gəlməyən; mübahisəli; **a ~ question** mübahisəli məsələ; **4.** incə, nazik; **a ~ issue** incə məsələ

**thorough** ['θʌrə] *adj* **1.** tam, tamam; bitmiş, başa çatdırılmış; **a ~ investigation** tam/başa çatdırılmış istintaq; **2.** mükəmməl, dəqiq; **a ~ analysis** mükəmməl/dəqiq təhlil; **a ~ worker** işlək/vicdanlı işçi; **3.** əsaslı, tutarlı; ətraflı, müfəssəl; **a ~ search** əsaslı tədqiqat; **4.** bitkin, kamil, əsl, tam; **~ knowledge of a subject** fənni kamil bilmə; **a ~ scoundrel** əsl yaramaz/alçaq; **a ~ gentleman** əsl centlmen
**thoroughbred**[1] ['θʌrəbred] *n* **1.** cins at; cins heyvan; **2.** yaxşı tərbiyə görmüş əsilzadə adam; **3.** ən yaxşı avtomobil/motosikl/velosiped
**thoroughbred**[2] ['θʌrəbred] *adj* **1.** cins, safqanlı *(heyvan haq.)*; **2.** yaxşı tərbiyə görmüş/ olunmuş; nəcabətli; kübar; **3.** eyibsiz, nöqsansız, qüsursuz, ləkəsiz, təmiz
**thoroughfare** ['θʌrəfeə^r] *n* **1.** əsas magistral, ana xətt; **2.** qələbəlik *(gediş-gəlişli)* küçə; mühüm nəqliyyat yolu *(şəhərdə)*; **3.** keçid, yol; *No thoroughfare Yol bağlıdır/ yoxdur (maşınlar üçün)*
**thoroughgoing** ['θʌrə.gəɪŋ] *adj* **1.** cəsarətli, qətiyyətli; qətiyyətlə hərəkət edən; güzəştsiz; **2.** qəti, köklü
**thoroughly** ['θʌrəlɪ] *adv* **1.** tamamilə, tam, lap; bütün, tam şəkildə, bütünlüklə; **2.** əsaslı surətdə; ciddi şəkildə; axıradək
**thoroughness** ['θʌrənɪs] *n* **1.** əsaslılıq, tutarlılıq; **2.** mükəmməllik; müfəssəllik
**those** [ðouz] **that** *əvəzliyinin cəm forması*: onlar, o; **~ buildings** o binalar; *I'll take one of those Mən onlardan birini götürəcəyəm*
**thou** [ðau] *pron. arx.* sən, siz
**though**[1] [ðou] *adv* bununla belə, lakin, ancaq, yenə də; buna baxmayaraq; hər halda; *Do as you like, though Ancaq özün/özünüz necə bilirsən/bilirsiniz, elə də et/edin; I must leave; I'll be back, though Mən getməliyəm; hərçənd ki, qayıdacağam*
**though**[2] [ðou] *conj* **1.** baxmayaraq, əgərçi; *I am against the resolution, though I admit that... Baxmayaraq ki, mən qətnamənin əleyhinəyəm, amma etiraf etməliyəm ki,...*; **2.** hərçənd, -sa/ -sə də; *Our house, though small, is very cosy Bizim evimiz, hərçənd balacadır, çox rahatdır; Though it rained, we went Yağış yağsa da, biz getdik*; **3.** hətta, ...da, ...də; əgər; *Though you may fail, you will have to try Hətta məğlub olsan/olsanız da, sən/siz cəhd göstərməli olacaqsan/olacaqsınız*; **strange ~ it may seem...** qəribə də olsa,...; *I'll do it though it kills me Hətta həyatım bahasına olsa da, mən bu işi görəcəyəm*; **as ~** elə bil, sanki, guya, guya ki, elə bil ki; *He is hesitating, as though he were afraid O tərəddüd edir, elə bil ki/sanki qorxur*
**thought**[1] [θɔ:t] *n* **1.** fikir, düşüncə; **to collect one's ~s** fikrini toplamaq/cəmləşdirmək; *That thought has crossed my mind O fikir mənim ağlımdan keçdi; What are your thoughts on this*



*matter? Bu məsələ barədə sənin/sizin fikrin/fikriniz nədir?*; **lost in ~** fikrə dalmış/qərq olmuş; **to read smb.'s ~** bir kəsin fikrini oxumaq; **to take ~** düşünmək, fikrə getmək; **2.** niyyət, məram, məqsəd, murad; *She has no thought of getting married Onun heç ərə getmək niyyəti yoxdur*; **3.** qayğı, diqqət; **to take/to show ~ for smb.** bir kəsin qayğısına qalmaq; *Thank you for your kind thought of me Mənə diqqətinə/ diqqətinizə görə təşəkkür edirəm/minnətdaram; Give this matter some thought Bu məsələyə bir qədər diqqət yetir/yetirin*; **4.** xəyalat, düşüncə, fikirləşmə; **to give ~ to** ətraflı düşünmək, götür-qoy etmək; **to give a lot of ~ to...** ...üzərində çox düşünmək; *He takes no thought for the future O, gələcək haqqında heç/əsla düşünmür;*
◊ *Second thoughts are best at. söz.* ≅ *Yüz ölç, bir biç*
**thought**[2] [θɔ:t] **to think** *felinin pt, pp formaları*
**thoughtful** ['θɔ:tfl] *adj* **1.** fikirli, dalğın; dərin/ətraflı düşünən; **a ~ look** dalğın/fikirli baxış; **2.** dərin fikirli, məzmunlu, dolğun *(kitab və s. haq.)*; **a ~ book** məzmunlu kitab; **3.** diqqətli, qayğıkeş, qeydəqalan; *He is very thoughtful towards others O, başqalarına qarşı çox diqqətlidir; It was thoughtful of you to remember her birthday Onun ad gününü xatırlamaq sənin/sizin diqqətli olmağını/ olmağınızı göstərir*
**thoughtfulness** ['θɔ:tfulnɪs] *n* qayğıkeşlik, qayğı, qayğıya/qeydə qalma; diqqət, iltifat
**thoughtless** ['θɔ:tlɪs] *adj* **1.** düşünülməmiş, fikirləşilməmiş; **2.** başısoyuq, səhlənkar; *The thoughtless driver passed the red light Səhlənkar sürücü qırmızı işıqda keçdi*; **3.** diqqətsiz; etinasız, ehtiramsız, hörmətsiz; *Our thoughtless neighbours are very noisy Bizim etinasız qonşular çox səs-küylüdürlər; It was thoughtless of you not to thank him Sənin/Sizin ona təşəkkür etməmən/etməməniz etinasızlıqdır*
**thoughtlessness** ['θɔ:tlɪsnɪs] *n* **1.** düşüncəsizlik, ağılsızlıq; düşüncəsiz/düşünülməmiş hərəkət; **2.** etinasızlıq, diqqətsizlik, laqeydlik, başısoyuqluq
**thought-out** ['θɔ:t'aut] *adj* ətraflı düşünülmüş, hərtərəfli ölçülüb-biçilmiş; **a well ~ argument** ətraflı düşünülmüş dəlil/sübut
**thousand** ['θauzənd] *num.* min; **a ~ times easier** min dəfə asan; *He made a thousand and one excuses O min dəfə üzr istədi; I have a thousand and one things to do Mənim min bir işim var*
**thousandfold**[1] ['θauzəndfould] *adj* min dəfə böyük, minqat
**thousandfold**[2] ['θauzəndfould] *adv* min dəfə, minqat
**thousandth** ['θauzəntθ] *num.* mininci
**thrall**[1] [θrɔ:l] *n* **1.** qul, kölə, əsir; **2.** *məc.* qul vəziyyətinə/şəraitinə düşmə, qul olma; *He is in the thrall to his passions O, ehtiraslarının quludur/ əsiridir*; **in the ~ of smoking** papiros çəkməyin əsiri

**thrall**[2] [θrɔ:l] *v tar.* qul etmək, əsarət altına almaq, kölə halına salmaq
**thrash** [θræʃ] *v* **1.** döymək *(çubuqla)*, vurmaq; döyəcləmək, kötəkləmək; **2.** qalib /üstün gəlmək, udmaq *(döyüşdə, yarışda və s.)*; **3.** döymək *(taxıl)*; **to ~ about 1)** kəskin hərəkət etmək; şappıldatmaq, sıçratmaq; *The children thrashed about in the water Uşaqlar suyu şappıldatdılar*; **2)** çapalamaq; çırpınmaq, vurnuxmaq *(xəstə haq.)*; **to ~ (about) in the bed with high fever** yüksək qızdırmadan yataqda çapalamaq; **to ~ out** müfəssəl müzakirə etmək; **to ~ a subject/conclusions** məsələni/nəticələri müfəssəl müzakirə etmək; **to ~ over** intəhasız/ dəfələrlə müzakirə etmək
**thrashel** ['θræʃəl] *n k.t.* zəncir
**thrasher** ['θræʃə^r] *n* **1.** kötəkləyən, vuran; cəzasını/ dərsini verən; **2.** taxıldöyən, xırmançı; **3.** *k.t.* taxıldöyən *(maşın)*; **4.** *zool.* dəniz tülküsü
**thrashing** ['θræʃɪŋ] *n* kötək; döymə, döyülmə *(çubuqla)*; **to give smb. a sound ~** bir kəsi lazımınca əzişdirmək, bir kəsin yaxşıca dərsini vermək
**thrashing-floor** ['θræʃɪŋflɔ:] *n k.t.* **1.** xırman, xırman meydançası; **2.** anbar
**thrashing-machine** ['θræʃɪŋmə.ʃi:n] *n k.t.* taxıldöyən maşın
**thraso** ['θreɪsou] *n* lovğa, özünü öyən *(adam)*
**thrasonical** [θrə'sɔnɪkl] *adj* özünü öyən, lovğa, öyünən, gopçu
**thread**[1] [θred] *n* **1.** sap; **sewing ~** tikiş sapı; **strong ~** möhkəm sap; **2.** tor; toxuma, naxış; **~s of a cobweb** hörümçək toru; **3.** tel *(sap şəklində olan şey)*; **grey ~s of hair** ağaran saçlar, gümüşü tellər; **a ~ of light** işıq şüası; **4.** *məc.* əlaqə, bağ; rabitə; **the ~ of a story** əhvalatın rabitəsi; **to lose the ~ of smth.** bir şeylə əlaqəni itirmək; **5.** *tex.* kərtmə, çərtmə; yiv, xır, şeş; **6.** *tex.* damar, tel, məftil, sim *(kabelin, şnurun və s.)*;
◊ **the ~ of life** ömür yolu, həyat; **~ and thrum** hamısı birlikdə; yaxşısı-pisi hamısı bir yerdə; **to hang by/on a ~** tükdən asılı olmaq; **worn to the last ~** köhnəlmiş, dağılmış, yırtılmış *(çox işlənməkdən)*; *I haven't a thread fit to wear Geyinməyə heç nəyim yoxdur*
**thread**[2] [θred] *adj* sapdan toxunmuş, toxunma; **~ gloves/stockings** toxunma əlcək/corab
**thread**[3] [θred] *v* **1.** saplamaq, iynə saplamaq; *Thread a needle for me Mənə bir iynə saplа/saplayın*; **2.** düzmək, keçirmək, sapa düzmək *(muncuğu və s.)*; **3.** yol çəkmək/salmaq; yol açmaq; **to ~ one's way through the crowd** izdihamın arasından özünə yol açmaq; **to ~ one's way through the forest** yolunu meşədən salmaq; **4.** ...keçmək; qırmızı xətlə keçmək *(vəzılmaq)*; **5.** saplamaq, hazırlamaq *(toxucu dəzgahını, tikiş maşınını və s.)*; **to ~ a film into the camera** filmi kameraya salmaq; **6.** *tex.* yiv aç-

maq; kərtmək, çərtmək; 7. hörmək, bir-birinə hörmək; toxumaq, bir-birinə keçirmək

**threadbare** ['θredbeə'] *adj* 1. dağılmış, köhnə, yırtılmış, köhnəlmiş *(paltar haq.)*; ~ **clothes** geyilmiş/nimdaş paltar; **a ~ carpet** sürtülmüş/ dağılmış xalça; 2. *məc.* bayağı, köhnəlmiş, çeynənmiş *(dəlil, sübut, fikir, mülahizə, zarafat, ifadə və s. haq.)*; **a ~ argument** bayağı dəlil, çeynənmiş sübut; **a ~ joke** bayağı zarafat; **a ~ theme** çeynənmiş mövzu; **a ~ story** köhnə əhvalat

**threaded** ['θredɪd] *adj* 1. sapdan toxunmuş; 2. *tex.* yivli, xırlı, şeşli

**threader** ['θredə'] *n* 1. vintaçan, yivaçan *(dəzgah)*; 2. vintaçan dəzgaha xidmət göstərən fəhlə; dəzgah fəhləsi

**threadlike** ['θredlaɪk] *adj* 1. sapaoxşar, sapabənzər, sap kimi; 2. lifli, tel-tel

**thread-mark** ['θredma:k] *n* su nişanı *(xüs. kağız pullarda işığa tutduqda görünən)*

**thready** ['θredɪ] *adj* 1. sapdan toxunmuş; sapaoxşar; ~ **worms/roots** sapaoxşar qurdlar/köklər; 2. lifli, tel-tel; 3. incə, zərif *(səs haq.)*; 4. yapışan, qatı *(maye, qatı maddələr haq.)*

**threat** [θret] *n* hədə, təhdid; qorxu, xətər, təhlükə; **the ~ of war** müharibə təhlükəsi; **a ~ to peace** sülhə təhlükə; **a ~ to life** həyati təhlükə; *He is always making threats O həmişə hədə-qorxu gəlir; She carried out her threat that she would resign O özünün istefa verəcəyi ilə hədələdi*; **to use/to utter ~s against** *smb.* bir kəsi hədələmək; **to pose a ~ to cause of peace** sülh işinə təhlükə yaratmaq; *Poverty and disease are threats to society Kasıblıq və xəstəlik cəmiyyət üçün qorxudur/təhlükədir*

**threaten** ['θretn] *v* **(with)** hədələmək, qorxutmaq, təhdid etmək; **to ~ with punishment** cəza ilə hədələmək; **to ~** *smb.* **with** *one's* **fist** bir kəsi yumruqla hədələmək; *Do you mean to threaten? Olmaya məni hədələyirsən/hədələyirsiniz? I don't threaten easily Məni qorxutmaq asan deyil; It threatens to rain Yağış qorxusu/təhlükəsi var*

**threatening** ['θretnɪŋ] *adj* 1. qorxuducu, təhdidedici, hədələyici; qorxulu, təhlükəli; **a ~ gesture** təhdidedici/hədələyici əl-qol hərəkəti; **a ~ letter** hədələyici məktub; 2. hədələyən, təhlükə yaradan, başının üstünü almış

**three** [θri:] *num.* üç; ~ **times** ~ üç dəfə üç; *She has three children Onun üç uşağı var*; **in ~s** üç-üç; **to come in ~s** içəri üç-üç gəlmək

**three-coloured** ['θri:'kʌləd] *adj* üçrəngli; ~ **banner** üçrəngli bayraq

**three-cornered** ['θri:'kɔ:nəd] *adj* 1. üçkünc; **a ~ hat** üçkünc şlyapa; 2. üçtərəfli *(üçüzvlü partiyanın, tərəfin və s. iştirakı ilə baş verən mübahisə, müzakirə və s. haq.)*; 3. *məc.* yöndəmsiz, biçimsiz, əndazəsiz

**three-decker** ['θri:'dekə'] *n* 1. üçgöyərtəli gəmi; 2. *məc.* trilogiya, üçcildlik roman; 3. üçlaylı sandviç *(yağ-çörək, pendir-çörək, kolbasa-çörək və s.)*

**three-dimensional** ['θri:dɪ'menʃənl] *adj* 1. üçölçülü, üç ölçüsü olan *(eni, uzunu, hündürlüyü)*; 2. stereoskopik *(şəkil, surət, təsvir və s. haq.)*

**three-field** ['θri:fi:ld] *adj k.t.* üçtarlalı; ~ **system** üçtarlalı əkin sistemi

**threefold¹** ['θri:fould] *adj* 1. üçhissəli; üç cür, üç şəkildə; 2. üçqat artıq, üç dəfə böyük, üç misli; 3. üç dəfə (olan); **a ~ increase** üç dəfə artım /artma/ çoxalma

**threefold²** ['θri:fould] *adv* üç dəfə, üç qat artıq; üç dəfə artıq/çox

**three-legged** ['θri:'legd] *adj* üçayaqlı, üçqıçlı; **a ~ table** üçayaqlı stol

**three-master** ['θri:'ma:stə'] *n* üçdorlu gəmi, üç doru olan gəmi

**three-phase** ['θri:feɪz] *adj el.* üçfazalı *(cərəyan haq.)*

**three-room** ['θri:'ru:m] *adj* üçotaqlı; **a ~ flat** üçotaqlı mənzil

**threescore** ['θri:'skɔ:'] *n arx.* altmış *(yaş haq.)*

**three-sided** ['θri:'saɪdɪd] *adj* üçtərəfli; üçyanlı

**threesome¹** ['θri:səm] *n* üçlük; üç nəfər

**threesome²** ['θri:səm] *adj* üç nəfərdən ibarət, üçlüyün icra etdiyi

**three-storey** ['θri:'stɔ:rɪ] *adj* üçmərtəbəli; **a ~ building** üçmərtəbəli bina

**three-story** ['θri:'stɔ:rɪ] *adj amer.* = **three-storey**

**three-time** ['θri:'taɪm] *adj* üç dəfə; ~ **champion** üç dəfə çempion

**three-way** ['θri:weɪ] *adj* 1. *tex.* üçhərəkətli *(sürət haq.)*; 2. *d.y.* üçyollu; 3. üçtərəfli; ~ **exchange** üçtərəfli mübadilə

**three-wheel** ['θri:'wi:l] *adj* *(həm də* **three-wheeled**) üççarxlı, üçtəkərli

**thremmatology** [ˌθremə'tɔlədʒɪ] *n* tremmatologiya *(ev heyvanlarının artırılması və mədəni bitkilərin becərilməsi haqqında elm sahəsi)*

**threnody** ['θrenədɪ] *n* matəm mahnısı; dəfn mərasimində oxunan nəğmə

**thresh** [θreʃ] *v k.t.* döymək *(taxıl)*; *Have the farmers started threshing? Əməkçilər taxılı döyməyə başlayıblarmı?*

**thresher** ['θreʃə'] *n* 1. *k.t.* taxıldöyən, xırmançı; 2. taxıldöyən *(maşın)*; 3. *zool.* dəniz tülküsü

**threshing** ['θreʃɪŋ] *n* 1. taxıl döymə; 2. xırman vaxtı

**threshing-floor** ['θreʃɪŋflɔ:'] *n k.t.* xırman, xırman meydançası

**threshing-machine** ['θreʃɪŋməˌʃi:n] *n k.t.* taxıldöyən maşın

**threshold** ['θreʃhould] *n* 1. kandar, astana; **to cross the ~** kandarı keçmək, daxil olmaq, içəri girmək; 2. *məc.* başlanğıc, giriş, ərəfə; **at the ~ of a new era** yeni dövrün başlanğıcında/astanasında; ~ **of a new career** yeni karyeranın/mənsəbin başlanğıcı; 3. *psix.* hədd, sərhəd; ~ **of consciousness** düşüncə həddi; ~ **of sensitivity** həssaslıq həddi

**threw** [θru:] **to throw** *felinin pt forması*

**thrice** [θraɪs] *adv* üç dəfə, üç kərə, üç yol; **to knock ~** üç dəfə döymək *(qapını)*; *She paid thrice what it is worth O, dəyəri üçqat ödədi*

**thrift** [θrɪft] *n* 1. qənaət, qənaətcillik, qənaətkarlıq; ehtiyatlılıq; sərhesablıq; faydalılıq, əlverişlilik; **to practice ~** qənaət etmək; qənaətlə yaşamaq; 2. *amer.* çiçəklənmə, tərəqqi, inkişaf; firavan həyat, xoşbəxt yaşama/yaşayış

**thriftbox** ['θrɪftbɔks] *n* daxıl, pul daxılı

**thriftily** ['θrɪftɪlɪ] *adv* qənaətlə, qənaətcilliklə

**thriftless** ['θrɪftlɪs] *adj* 1. israfcıl, israfçı, bədxərc; 2. sərfəsiz, faydası olmayan

**thriftshop** ['θrɪftʃɔp] *n* köhnə (geyilmiş) paltar və işlənmiş mallar dükanı

**thrifty** ['θrɪftɪ] *adj* 1. qənaətcil, qənaətkar, yığımcıl; sərhesab, öz xeyrini bilən, ehtiyatlı; ~ **housewife** qənaətcil evdar qadın; *She was too thrifty to keep a servant O, o qədər qənaətcil idi ki, heç qulluqçu da saxlamırdı*; 2. *amer.* çiçəklənən, firavan/şən həyat keçirən; işi gətirən

**thrill¹** [θrɪl] *n* 1. həyəcan; həvəs; *My first airplane ride was a real thrill Mənim təyyarə ilə ilk uçuşum əsl həyəcan idi*; 2. titrəmə, lərzə, əsmə; 3. titrəyiş, tərpənmə; 4. kəskin duyğu, hiss

**thrill²** [θrɪl] *v* 1. həyəcanlandırmaq, həvəsləndirmək; *The film thrilled the audience Film tamaşaçıları həyəcanlandırdı; His voice thrilled the listeners Onun səsi dinləyiciləri həyəcanlandırdı*; 2. əsmək, titrəmək, lərzəyə gəlmək *(qorxudan, sevincdən və s.)*; *My heart thrilled with joy Qəlbim sevincdən riqqətə gəldi, Ürəyim sevincdən əsdi; His voice thrilled with emotion Həyəcandan onun səsi titrədi*; 3. məftun/valeh etmək, təsir altına almaq, cəlb etmək, çox maraqlandırmaq; *We were thrilled to hear the news Xəbərlər bizi çox maraqlandırdı*; **to ~ the audience** tamaşaçıları valeh/heyran etmək; *It thrilled me to learn of your success Sənin/Sizin müvəffəqiyyətin/ müvəffəqiyyətiniz məni valeh etdi*; 4. əsmək, titrəmək; titrətmək, əsdirmək; **to ~ the land** yeri titrətmək; *The earth seemed to thrill Elə bil ki, yer titrədi*

**thrilled** ['θrɪld] *adj* 1. həyəcanlı, təlatümlü; təlaşlı, təşvişli, qızğın, hərarətli, coşğun; *They were thrilled with the gift Onlar hədiyyədən həyəcanlandılar*; 2. maraqlı, maraqlandırılmış; ələ alınmış; *She was thrilled to receive an invitation Dəvətnaməni aldıqda onu maraq götürdü /büründü*

**thriller** ['θrɪlə'] *n* oxucunu/tamaşaçını maraqlandıran fövqəladə /sensasiyalı kitab/ tamaşa/ kino/ veriliş/ reportaj; ~ **about international terrorism** beynəlxalq terrorizm haqqında sensasion reportaj; *The match was a thriller Yarış çox maraqlı idi*

**thrilling** ['θrɪlɪŋ] *adj* 1. valehedici, məftunedici; təsirli; maraqlı, cəlbedici; **a ~ detective** maraqlı/ cəzbedici detektiv; 2. titrək, titrəyən, əsən

**thrive** [θraɪv] *(pt* **throve** [θrouv]; *pp* **thriven** [θrɪvn]) *v* 1. çiçəklənmək, inkişaf etmək; uğur qazanmaq; *The business is thriving Biznes inkişaf edir*; 2. xoşbəxt olmaq/yaşamaq, firavan yaşamaq; *He is thriving O, firavan yaşayır*; 3. artmaq, çoxalmaq; qol-budaq atmaq, şaxələnmək; *Plants thrive under her care Bitkilər onun qayğısı sayəsində artır*; 4. xoşuna gəlmək, döşünə yatmaq; *He thrives on hard work Ağır iş onun xoşuna gəlir/döşünə yatır*

**throat¹** [θrout] *n* 1. boğaz; hülqum, xirtdək; **to clear** *one's* ~ boğazını arıtmaq; **to be full to the ~** canı boğazına yığılmaq; **to stick in** *one's* ~ boğazında qalmaq *(sümük, tıx, qılçıq, çəyirdək və s.)*; 2. dar yol, keçid; deşik, dəlik; **the ~ of a bottle** butulkanın boğazı; 3. vulkan ağzı; 4. *tex.* ağız, boğazlıq; 5. *tex.* domna peçinin ağzı;
◊ **to cut** *one's* **own ~** özünə quyu qazmaq; **to jump down someone's ~** bir kəsi susdurmaq, bir kəsin ağzını yummaq; **to cut one another's ~** qatı düşmənçilik etmək; **to give** *smb.* **the lie in his ~** bir kəsin ağ yalanını ifşa etmək; **to thrust/to cram** *smth.* **down** *smb.'s* ~ bir şeyi bir kəsin zorla boynuna qoymaq

**throat²** [θrout] *v* 1. mırıldamaq, öz-özünə /burnunun altında danışmaq; 2. xırıltılı səslə oxumaq, xırıltılı səslə /pəsdən oxumaq, zümzümə etmək

**throaty** ['θroutɪ] *adj* 1. xırıltılı, batıq, tutqun; 2. boğazdan/ qırtlaqdan çıxan *(səs)*

**throb¹** [θrɔb] *n* 1. titrəmə, əsmə, lərzə, həyəcan; 2. vurma *(nəbzdə, qan damarında)*, döyünmə, döyüntü *(ürəkdə)*; 3. *mus.* titrəmə, vibrasiya, titrəyiş

**throb²** [θrɔb] *v* (-bb-) 1. *tib.* vurmaq *(qan damarı, nəbz)*, döyünmək *(ürək)*; 2. titrəmək, əsmək; *My temples are throbbing Gicgahım partlayır, Başım bərk ağrıyır*; 3. *məc.* lərzəyə gəlmək /düşmək, zağ-zağ əsmək

**throe** [θrou] *n pl tib.* 1. dəhşətli ağrı, əzab, əziyyət; işgəncə, məşəqqət; **the ~s of childbirth** doğuş ağrıları; 2. can vermə; **~s of death** can vermə, ölümqabağı ağrılar

**thrombosis** [θrɔm'bousɪs] *n tib.* tromboz *(damarlarda qan laxtası əmələ gəlməsi)*; **coronary ~** vena damarının trombozu; infarkt; **aortic ~** aortanın stenozu/daralması; **jumping ~** hərəkət edən tromboz

**thrombus** ['θrɔmbəs] *n tib.* tromb *(qan damarında qan laxtasının əmələ gəlməsi)*

**throne¹** [θroun] *n* 1. taxt, taxt-tac; 2. **(the ~)** kral, hökmdar, padşah; hakimiyyət; 3. yüksək mövqe/yer; *The king lost his throne in the revolution İnqilab zamanı kral öz mövqeyini/taxt-tacını itirdi*

**throne**[2] [θroun] *adj* taxt-tac; **a ~ room** taxt-tac salonu *(padşah taxtının olduğu salon)*

**throne**[3] [θroun] *v* **1**. taxta oturtmaq/çıxartmaq; **2**. böyük mövqe tutmaq, hörmətli olmaq, sözü keçmək

**throng**[1] [θrɔŋ] *n* **1**. dəstə, yığın, izdiham, camaat, güruh; **2**. kütlə; çoxluq, külliyyat

**throng**[2] [θrɔŋ] *v* **1**. yığışmaq, toplaşmaq; toplanmaq; *People thronged the square Camaat meydana toplaşdı;* **2**. ağzınacan doldurmaq *(evi, binanı, yeri və s.)*

**throstle** [ˈθrɔsl] *n zool.* **1**. oxuyan qaratoyuq; **2**. daraqlı əyirici maşın

**throttle**[1] [ˈθrɔtl] *n tex.* drossel *(mayenin, qazın, buxarın təzyiqini və işləməsini nizama salmaq üçün qurğu)*; **at full ~** tam sürətlə; tam gücü ilə; *Give her a bit more throttle Sürəti bir az artır/artırın*

**throttle**[2] [ˈθrɔtl] *v* **1**. boğmaq; **to ~ freedom** azadlığı boğmaq; **2**. *tex.* sıxışdırmaq, söndürmək; **to ~ an engine** mühərriki söndürmək; **to ~ down** qazı /sürəti azaltmaq

**through**[1] [θru:] *adj* **1**. birbaşa, düz; **~ service** birbaşa əlaqə; **~ train** birbaşa (gedən) qatar; **~ flight** birbaşa uçuş; **2**. maneəsiz, əngəlsiz, sərbəst; **~ passage** sərbəst keçid; **to be ~** qurtarmaq; *Aren't you through yet? Hələ qurtarmamısan/qurtarmamısınız? Don't go, I'm not through with you yet Getmə/ Getməyin, mən hələ səninlə/sizinlə quntarmamışam; I am through with her Mən onunla əlaqəni kəsmişəm; Are you through? Qurtardın/ Qurtardınız? Are you through with the hammer? Çəkic sənə/sizə lazım deyil ki?*

**through**[2] [θru:] *adv* **1**. başdan-ayağa qədər, tamam; *We got wet/soaked through Biz tamam isländıq; He is evil through and through O başdan-ayağa pislik/ yamanlıq mücəssəməsidir; I read the play through Mən pyesi başdan-ayağa oxudum; He heard my speech through O mənim nitqimi axıracan dinlədi*; **to sing a song ~** mahnını axıra kimi oxumaq; **to carry ~** başa çatdırmaq/vurmaq, tamamlamaq; *I will go through with it, whatever happens Nəyin bahasına olursa olsun, mən bu işi başa çatdıracağam*; **to put a person ~** bir adamı calaşdırmaq *(telefonda); I'll put you through to him Mən səni/sizi onunla calaşdıracam; I couldn't get through to him Mən ona zəng edə bilmədim, Mən onunla telefon əlaqəsi yarada bilmədim; You are through! Danış! Danışın!*; **2**. fasiləsiz, aramsız, bütün, başdan-başa

**through**[3] [θru:] *prep.* **1**. …içindən, …ortasından, …arasından; -dan, -dən; **to go ~ a tunnel** tuneldən/ tunelin içərisindən keçmək; **to make *one's* way ~ a crowd** yarıb izdihamın arasından keçmək; **to breathe ~ *one's* mouth** ağızdan nəfəs almaq; *The bullet went right through him Güllə onu deşib keçdi*; **to look ~ a telescope** teleskopdan baxmaq; **a path ~ the forest** meşədən keçən yol/cığır; **to speak ~ *one's* nose** burnunda danışmaq, mızıldamaq; **to go ~ many trials** çox sınaqlardan keçmək; **2**. …ilə, -la, -lə; **to walk ~ the mud** palçıqlıqla (palçıq yolla) getmək; **3**. -da, -də; **to fly ~ the air** havada uçmaq; **4**. -ı, -i; **to travel ~ France** Fransanı dolaşmaq/ gəzmək; **to walk ~ the streets** küçələri dolaşmaq/gəzmək; **5**. …üzündən, … görə; -dan, -dən; nəticəsində; sayəsində, ucbatından; **~ no fault of mine** mənim səhvim /təqsirim üzündən olmayan; *He won out through sheer courage O, cəsarət sayəsində qələbə çaldı*; **~ ignorance** nadanlıq ucbatından; *It was through you that we were late Sənə/Sizə görə biz gecikdik*; **6**. -dək; **from May ~ September** may ayından sentyabradək; *I'm staying through Sunday Bazar gününədək burada olacağam; This sale is on through Friday Satış cümə gününədək davam edəcək*; **7**. …müddətində, …ərzində *(adət.* **all ~***)*; **all ~ dinner** nahar müddətində; **all ~ the night** bütün gecəni, sübh açılana kimi, səhərə qədər/kimi; **8**. vasitəsilə, ilə; **to speak ~ an interpreter** tərcüməçi/dilmanc vasitəsilə danışmaq; *I heard of you through your sister Sənin/Sizin haqqında/ haqqınızda bacından/ bacınızdan eşitdim; We learned the news through friends Biz xəbəri dostlardan öyrəndik, Biz dostlar vasitəsilə xəbər tutduq*; **9**. …yolu ilə, …üsulu ilə, …köməyi ilə; **to achieve *one's* goals ~ revolution** məqsədlərinə inqilab yolu ilə nail olmaq; **10**. əvvəldən axıradək, bütün; *We stayed in Milan through the summer Biz bütün yayı Milanda qaldıq*; **to look ~** nəzərdən/gözdən keçirmək; **to look ~ a report** məruzəni nəzərdən keçirmək; **to go ~ a red light** qırmızı işıqda getmək/keçmək; **to pass ~ three stages of development** üç inkişaf mərhələsi keçmək; **to leaf ~ a book** kitabı vərəqləmək, kitaba göz gəzdirmək; **to live ~ a crisis** böhran keçirmək, böhranı yaşamaq

**throughout**[1] [θruˈaut] *adv* **1**. hər yerdə/yanda/tərəfdə; **2**. hər cəhətdən; başdan-başa; *The house is furnished throughout Ev tamam/başdan-başa avadanlıqla döşənmişdi; The room needs painting throughout Otağı başdan-başa rəngləmək gərəkdir*; **3**. əvvəldən axıra(dək); *She stayed hopeful throughout O, əvvəldən axıradək ümidini kəsmədi/itirmədi; The dictionary has been revised throughout Lüğət əvvəldən axıradək yenidən işlənmişdir*

**throughout**[2] [θruˈaut] *prep.* bütün, hər; ərzində, müddətində; *The fire spread throughout the barn Yanğın bütün anbarı bürüdü; It rained throughout the day Bütün günü yağış yağdı*; **~ the country** ölkənin hər yerində; **~ the war** müharibə müddətində; **~ the 19$^{th}$ century** XIX əsr boyu/ ərzində/müddətində



**throw**[1] [θrou] *n* **1**. atma, tullama, atış; **at a single ~** bir atışla/zərbə ilə; **2**. *id.* tullama, atma *(güləşdə)*; **~ in circle flying overhead** başı üzərindən fırladıb atma; **~ from standing position** yerində dayanıb atma; **discus ~** disk atma; *It's your throw Atma sənin/sizin növbəndir/növbənizdir*; **3**. *id.* səhv zərbə *(badminton oyununda)*; **4**. *id.* tullama/atma məsafəsi; sıçrayış; **5**. örtük *(çarpayının)*; **6**. *amer., d.d.* dənə, ədəd; **to sell *smth.* at four dollars a ~** bir dənəsini dörd dollara satmaq

**throw**[2] [θrou] *v* *(pt* **threw** [θru:]; *pp* **thrown** [θroun]) **1**. atmaq, tullamaq; **to ~ the ball to someone** topu bir kəsə atmaq/tullamaq; **to ~ stones at someone** bir kəsə daş atmaq; **to ~ snowballs at each other** bir-birinə qartopu atmaq; **to ~ a stone through the window** pəncərəyə daş atmaq; **to ~ *smth.* out of the window** bir şeyi pəncərədən atmaq; **2**. atılmaq, üstünə tullanmaq, şığımaq; **to ~ oneself** üstünə atılmaq, tullanmaq; sıçramaq; **to ~ oneself at *smb./smth.*** bir kəsin/bir şeyin üstünə şığımaq/ atılmaq; **to ~ a glance** nəzər salmaq; **to ~ oneself at someone's arms** özünü bir kəsin ağuşuna atmaq, bir kəsin ağuşuna atılmaq; *The girl threw her arms round his neck Qız qollarını onun boynuna sarıdı*; **3**. salmaq, düşürmək *(atdan)*; **4**. qabıq qoymaq, dəyişmək *(ilan)*; **5**. atmaq, salmaq, örtmək; **to ~ a shawl over *one's* shoulders** çiyninə şal salmaq/ atmaq; **6**. salmaq *(müəyyən hala)*; **to ~ into confusion** vəlvələyə/çaxnaşmaya salmaq; **7**. balalamaq, doğmaq, buzovlamaq; **8**. əyirmək; burmaq, eşmək; **9**. *id.* kürəyini yerə vurmaq, kürəkləri üstə yıxmaq *(güləşdə)*; **10**. *d.d.* düzəltmək, təşkil etmək *(qonaqlıq, əyləncə gecəsi)*; vermək *(ziyafət, qonaqlıq və s.)*; **11**. *id.* bilərəkdən uduzmaq *(yarışda, oyunda və s.)*; **12**. qurmaq, düzəltmək, salmaq *(körpü)*; **13**. *məc.* salmaq, atmaq; **to ~ *smb.* into jail** bir kəsi zindana atmaq/salmaq; **14**. *məc.* yıxmaq, atmaq; **to ~ the blame on *smb.*** günahı bir kəsin üstünə atmaq/yıxmaq; **to ~ light on *smth.*** bir şeyi aydınlaşdırmaq; bir şeyin üzərinə işıq salmaq; **to ~ suspision on *smth.*** bir şeyi şübhə altına almaq; **to ~ about** səpələmək, havaya sovurmaq *(pulu)*; **to ~ aside** kənara atmaq/tullamaq; **to ~ away 1**) atmaq, kənara atmaq; **2**) boş yerə sərf etmək, səmərəsiz xərcləmək *(pulu, sərmayəni)*; **3**) buraxmaq, qaçırtmaq *(əlindən)*; əldən vermək; **to ~ away an advantage** fürsəti əldən vermək/ qaçırtmaq; **to ~ back** geriyə atmaq, geriyə əymək; **to ~ back *one's* head** başını geriyə əymək; **to ~ down** aşağı salmaq/düşürmək; çıxartmaq *(paltarı)*; **to ~ oneself down** yerə sərilmək; **to ~ down *one's* tools 1**) tətil etmək; **2**) dağıtmaq, sökmək, yıxmaq, uçurtmaq *(bina, ev və s.)*; **3**) rədd etmək, qəbul etməmək *(təklifi, təşəbbüsü və s.)*; *amer.* **to ~ down *one's* brief** *amer. hüq.* işi/prosesi davam etdirməkdən imtina etmək; **to ~ in 1**) əlavə /daxil etmək; **2**) *tex.* daxil/əlavə etmək; **to ~ off 1**) rədd etmək; **2**) kənara tullamaq, çıxartmaq; **to ~ *smb.* off balance** bir kəsi hövsələdən çıxartmaq; **to ~ off an illness** xəstəlikdən sağalmaq; **to ~ on 1**) çiyninə atmaq/örtmək; geyinmək *(palto, paltar)*; **2**) atmaq *(odun, kömür və s.)*; **to ~ on coals** kömür atmaq *(ocağa, sobaya, peçə və s.)*; **to ~ out 1**) bayıra tullamaq/atmaq; **2**) çıxarıb atmaq, çıxartmaq *(qulluqdan, vəzifədən)*; **3**) buraxmaq, saçmaq, yaymaq *(şüa, işıq, isti və s.)*; **4**) sözarası demək; **5**) *hüq.* rədd etmək, qaytarmaq *(qanun layihəsini)*; **6**) dolaşdırmaq, çaşdırmaq, dolaşıq salmaq, çaşmaq *(hesablamada)*; **7**) *hərb.* çıxarmaq, çıxartmaq; **8**) *id.* ötüb keçmək, ötmək, geridə buraxmaq; **9**) yanında tikmək, tikib əlavə etmək; **to ~ out a new wing** yeni cinah tikib əlavə etmək *(binaya)*; **to ~ over 1**) atmaq, tərk etmək*(dostları)*; **2**) rədd/imtina etmək, razılıq verməmək *(plana, təşəbbüsə və s.)*; **3**) *tex.* dəyişdirmək *(cərəyanın istiqamətini)*; **to ~ together 1**) tələsik tərtib etmək, əlüstü quraşdırmaq, kompilyasiya etmək *(köçürmək)*; **2**) bir yerə yığmaq, toplamaq *(adamları, camaatı)*; **to ~ up 1**) atmaq; **2**) nəzər salmaq, gözlərini qaldırıb baxmaq; qaldırmaq *(əlləri)*; **3**) tez tikmək, qurmaq *(ev, barrikada)*; **4**) ayırmaq, nəzərə çarpdırmaq; **5**) iştirakdan imtina etmək; **6**) *amer.* irad tutmaq, tənqid etmək; **7**) püskürmək, yağdırmaq;

◊ **to ~ the great cast** qəti addım atmaq; **to ~ a fit** qəzəblənmək, qeyzlənmək; **to ~ oneself at the head of *smb.*** *d.d.* bir kəsin boğazından /boynundan asılmaq; **to ~ the cap over the mill** pis şeyə adət etmək, pis yola düşmək; **to ~ the bull** *amer. sl.* boş-boş danışmaq; yalan danışmaq; **to ~ a chest** *d.d.* sinəsini qabağa vermək, qabağa durmaq

**throwaway**[1] [ˈθrouə.weı] *n* reklam vərəqi; buklet *(alıcılara pulsuz paylanan)*

**throwaway**[2] [ˈθrouə.weı] *adj* yararsız, dəyərsiz; birdəfəlik, bir dəfə işlədilən; **a ~ bottle/box/ package** birdəfəlik butulka/qutu/paket

**throw-back** [ˈθroubæk] *n* **1**. tənəzzül. geriləmə, dala getmə; ləngimə, yubanma; **2**. *biol.* atavizm *(nəsildə qədim babalarına məxsus əlamətlərin görünməsi)*; *The youngest son was a throw-back to his ancestors Ən balaca oğulda ulu babalarının əlamətləri vardı*

**thrower** [ˈθrouəʳ] *n* **1**. atan, tullayan, tullayıcı; qumbaraatan, bombaatan *(əsgər)*; **discus ~** diskobol *(disk atan idmançı)*; **2**. dulusçu *(saxsı qab qayıran)*; **3**. atıcı, tullayıcı aparat *(alət, mexanizm, qurğu)*

**throw-in** [ˈθrouˈın] *n id.* oyuna daxil etmə *(topu, şaybanı)*

**thrown** [θroun] **to throw** *felinin pp forması*

**thrown silk** [ˈθrounˈsılk] *n* eşilmiş/burulmuş ipək

**throw-off** [ˈθrouˈɔf] *n* başlanğıc, əvvəl *(ovda, qaçışda)*

**throw-out** [ˈθrouˈaut] *n d.d.* tullantı, tör-töküntü; zibil, zir-zibil

**throwster** ['θroustə'] *n toxuc.* ipək eşən/buran *(işçi)*
**thrum[1]** [θrʌm] *n toxuc.* 1. ucu burulmamış sap; 2. saçaq; 3. zınqıltı, cingilti; danqıltı
**thrum[2]** [θrʌm] *v* 1. zınqıldatmaq, cingildətmək; 2. barmaqları ilə dınqıldatmaq/taqqıldatmaq
**thrush** [θrʌʃ] *n* 1. *zool.* qaratoyuq; 2. *tib.* ağız gəlməsi, süd yarası *(xəstəlik)*; 3. *zool.* haçanın çürüməsi *(atın dırnağında)*
**thrust[1]** [θrʌst] *n* 1. təkan; itələmə; 2. zərbə; hücum; 3. kəskin çıxış *(əleyhinə)*, acı/toxunan söz; 4. silahlı hücum; 5. *tex.* dayaq, dirək, söykənəcək, istinad; 6. *geol.* üfüqi və ya yanakı təzyiq; 7. *amer.* hərəkət qüvvəsi, dartma qüvvəsi
**thrust[2]** [θrʌst] *v* 1. itələmək, dürtmək, sancmaq; 2. sancmaq, batırmaq, deşmək, dəlmək; 3. soxmaq, qoymaq; **to ~ *one's* hands into *one's* pockets** əllərini ciblərinə soxmaq; 4. soxulmaq, girmək, itələyə-itələyə soxulmaq; **to ~ *one's* way** itələyə-itələyə özünə yol açmaq; **to ~ oneself into a well-paid position** yaxşı maaşlı vəzifəyə soxulmaq; 5. zorla boynuna qoymaq/qəbul etdirmək, vadar etmək; **to ~ aside** kənara itələmək, bir kənara tullamaq; **to ~ forth** itələyib /vurub çıxartmaq; itələyib keçirtmək/ dürtmək; **to ~ in** sancmaq, batırmaq, əlavə etmək; **to ~ in a word** söz əlavə etmək; **to ~ out** qovmaq, çıxartmaq *(evdən)*, bayıra atmaq;
◊ **to ~ oneself forward** özünə fikir vermək, özünə diqqət yetirmək; **to ~ oneself into *smb.'s* society** bir kəsin boğazına keçmək
**thud[1]** [θʌd] *n* 1. taqqıltı, tıqqıltı, şappıltı; **the ~ of hooves** ayaq dırnaqlarının taqqıltısı *(atın)*; **to fall with a ~** gumbultu ilə yerə yıxılmaq/düşmək; 2. boğuq səs
**thud[2]** [θʌd] *v* (-dd-) 1. yıxılmaq, düşmək, gumbultu ilə yıxılmaq, guppultu ilə düşmək; 2. boğuq səslə dəymək, toxunmaq; *Bullets thudded into the sandbags Güllələr boğuq səslə qum kisələrinə dəydi*
**thug** [θʌg] *n* 1. başkəsən, quldur, qatil; 2. *amer.* evyaran oğru; talançı, soyğunçu
**thuggee** ['θʌgi:] *n* = **thuggery**
**thuggery** ['θʌgəri] *n amer.* 1. banditizm, quldurluq; 2. qətl, öldürmə
**thuja** ['θju:dʒə] *n bot.* tuya, mazı ağacı
**thulium** ['θju:lıəm] *n kim.* tulium
**thumb[1]** [θʌm] *n* baş barmaq *(əldə)*;
◊ **under *smb.'s* ~** bir kəsin tam təsiri/hökmü altında, bir kəsin tam itaətində; *Thumbs up! Pis deyil! Münasibdir! Yarayar!* **to be all ~s** ağırtərpənən /ləng/bacarıqsız olmaq; **to be ~s down** əksinə/ əleyhinə /ziddinə olmaq
**thumb[2]** [θʌm] *v* 1. vərəqləmək, gözdən keçirmək *(kitabı, jurnalı)*; **to ~ through a book** kitab vərəqləmək; 2. çirkləndirmək, kirləndirmək, ləkələndirmək *(çox əl vurmaqla)*; 3. *d.d.* baş barmağı qaldırmaqla avtomobili saxlatmaq;
◊ **to ~ *one's* nose at *smb.*** sataşmaq, ağzını yamsılamaq

**thumb-index** ['θʌm.ındeks] *n* göstərici *(əlifba sırası ilə)*
**thumb-mark** ['θʌmma:k] *n* barmaq izi *(kitabın səhifələrində)*
**thumb-nail[1]** ['θʌmneıl] *n* baş barmağın dırnağı
**thumb-nail[2]** ['θʌmneıl] *adj* 1. kiçik, xırda, balaca; 2. qısa, müxtəsər; **~ sketch** qısa təsvir
**thumb-print** ['θʌmprınt] *n* baş barmağın izi *(daktiloskopiyada)*
**thumbscrew** ['θʌmskru:] *n* 1. *tar.* baş barmağı sıxmaq üçün məngənə *(işgəncə aləti)*; 2. *tex.* diyircəkli başlığı olan vint; 3. *amer. tex.* ikiqulaqlı qayka
**thumb-tack** ['θʌmtæk] *n amer.* cizgi knopkası; basmadüymə
**thump[1]** [θʌmp] *n* 1. tappıltı, guppultu; ağır zərbə; *The baby fell out with a thump Uşaq tappıltı ilə yıxıldı*; 2. boğuq səs
**thump[2]** [θʌmp] *v* 1. döyəcləmək, ağır zərbə endirmək; vurub deşmək; *He was thumping the keys of the piano O, royalın dillərini döyəcləyirdi*; 2. vurulmaq, zərbə almaq; 3. vurmaq, döyünmək; *His heart was thumping with excitement Həyəcandan onun ürəyi döyünürdü*
**thumper** ['θʌmpə'] *n* 1. *d.d.* çox böyük bir şey; 2. ağ yalan, açıq-aşkar yalan
**thumping** ['θʌmpıŋ] *adj* çox iri/böyük, yekə, nəhəng; artıq, üstün; **~ majority** böyük əksəriyyət
**thunder[1]** ['θʌndə'] *n* 1. ildırım, göy gurultusu; gurultu; 2. şaqqıltı, gurultu, patırtı, xarıltı; 3. *pl* kəskin məzəmmət; hədə
**thunder[2]** ['θʌndə'] *v* 1. göy guruldamaq; guruldamaq, gurultu salmaq; *Lorries thundered past Yük maşınları gurultu ilə keçib gedirdilər*; 2. vurmaq, döymək; döyəcləmək; cingildəmək; *His voice thundered in my ears Onun səsi qulaqlarımda cingildədi*; 3. dağıtmaq, darmadağın etmək, tar-mar etmək; 4. ucadan danışmaq, bərkdən demək, uca səslə danışmaq
**thunderbolt** ['θʌndəboult] *n* ildırım vurması *(həm də məc.)*; **to come/to be a ~** ildırım kimi çaxmaq/vurmaq; **like a ~ from/out of a clear sky** əsla gözlənilmədən; *This news was a thunderbolt to her Bu xəbər gözlənilmədən onun başına ildırım kimi çaxdı*
**thunderclap** ['θʌndəklæp] *n* 1. ildırım çaxması/ zərbəsi; 2. *məc.* gözlənilməz hadisə; qorxulu / müdhiş xəbər; *This news came on him like a thunderclap Bu xəbər onun üçün çox gözlənilməz oldu*
**thundercloud** ['θʌndəklaud] *n* qara bulud
**thunderer** ['θʌndərə'] *n* 1. məğlubedilməz/yenilməz əsgər/döyüşçü; 2. gözəl natiq; 3. *məc.* əzazil
**thunderous** ['θʌndərəs] *adj* 1. ildırımlı; tufan olacağını bildirən; 2. gurultulu, çox güclü; qulaqbatırıcı, qulaqbatıran; **~ applause** gurultulu alqış
**thunderstorm** ['θʌndəstɔ:m] *n* tufan *(ildırımlı, yağışlı)*



**thunderstroke** ['θʌndəstrouk] *n* göy gurultusu, ildırım
**thunderstruck** ['θʌndəstrʌk] *adj* 1. sarsımış, sarsıdılmış, heyrətə salınmış, çaşmış, çaşdırılmış, sarsıdılmış; **~ with his misfortune** uğursuzluğundan sarsımış; **~ by/with the news** xəbərdən sarsımış/ çaşmış; 2. *arx.* ildırım vurmuş
**Thursday** ['θə:zdı] *n* cümə axşamı; **on ~** cümə axşamı (günü)
**thus** [ðʌs] *adv* 1. belə; beləliklə, bu minvalla, bu yolla; **~ and ~** belə və belə; bu cür; *He began thus O belə başladı; Thus I was unable to attend Beləliklə, mən iştirak edə bilmədim*; 2. ...qədər, ...kimi, -dək, -cən, -can; bu dərəcəyə qədər, bu və ya digər dərəcədə; **~ far** hələlik, bu vaxtacan, bu günəcən; *Thus far everything is all right Hələlik hər şey qaydasındadır*
**thwack[1]** [θwæk] *n* güclü zərbə *(xüs. qamçı və ya ağac zərbəsi)*; **to give *smb.* a ~** bir kəsi qamçı ilə döymək
**thwack[2]** [θwæk] *v* 1. zərbə ilə vurmaq, döyəcləmək, kötəkləmək, əzişdirmək; **to ~ *smb.*** bir kəsi kötəkləmək/ əzişdirmək; **to ~ each other** bir-birini əzişdirmək/döyəcləmək/kötəkləmək; 2. beyninə yeritmək, başa salmaq; 3. birləşdirmək; 4. guppultu ilə düşmək; **to ~ down** guppultu ilə yerə düşmək
**thwart[1]** [θwɔ:t] *adj* 1. köndələn, eninə /köndələn qoyulan; **~ lines** köndələn *(kəsişən)* xətlər; **~ wind** qarşıdan əsən külək; 2. tərs, inad, höcət
**thwart[2]** [θwɔ:t] *v* 1. mane olmaq; **to ~ *smb.'s* plans** bir kəsin planlarına mane olmaq; *I was thwarted at every turn Hər addımda mənə mane olurdular*; 2. pozmaq, şətəl qatmaq, pəl vurmaq; dağıtmaq *(planı, niyyəti, məqsədi və s.)*; 3. söz qaytarmaq, etiraz etmək; 4. *d.d.* qabağını/yolunu kəsmək
**thyme** [taım] *n bot.* kəklikotu, kəkotu
**thyroid[1]** ['θaırɔıd] *n anat.* qalxanaoxşar/qalxanvarı vəzi
**thyroid[2]** ['θaırɔıd] *adj* qalxanaoxşar, qalxanabənzər, qalxanvarı; **~ gland** qalxanvarı vəzi
**Tibetan[1]** [tı'betən] *n* Tibetli, Tibet sakini
**Tibetan[2]** [tı'betən] *adj* Tibet; **~ writing** Tibet yazısı; **~ wool** Tibet yunu; **~ shawls** Tibet şalları
**tick[1]** [tık] *n* I *zool.* gənə
**tick** [tık] *n* II 1. çıqqıltı, taqqıltı; çıqqıldama, taqqıldama *(saat səsi)*; **the ~ of the clock** saatın tıqqıltısı; 2. işarə, nişan; 3. *d.d.* dəqiqə, bircə dəqiqə; *Just a tick! Bircə dəqiqə! I'll be with you in a tick Bircə dəqiqəyə gəlirəm; He'll do it in two ticks O bunu əlüstü/o saat /dərhal edəcək*
**tick** [tık] *n* III *d.d.* 1. kredit; **to go ~** kredit götürmək; **to buy *smth.* on ~** bir şeyi kreditlə almaq; **to run on ~** kredit almaq, borca girmək; 2. hesab, haqq-hesab
**tick** [tık] *n* IV örtük, çexol
**tick[2]** [tık] *v* I 1. tıqqıldamaq, çıqqıldamaq *(saat)*; *The clock ticks Saat tıqqıldayır/çıqqıldayır*; 2. nişan qoymaq, işarə etmək; **to ~ off** qeyd etmək, nişanlamaq; **to ~ the correct answer off a list** düzgün cavabları siyahıda qeyd etmək
**tick** [tık] *v* II 1. kredit götürmək, borc almaq; 2. nisyə satmaq, kreditə vermək; 3. *amer.* sadalamaq, bir-bir saymaq; *Tick off the names on the list Siyahıdakı adları oxu/oxuyun*
**ticker** ['tıkə'] *n* 1. kəfkir, rəqqas *(saatda)*; 2. *d.d.* saat; 3. *zaraf.* ürək, qəlb; 4. *rad.* zummer *(telefonda, elektrik cihazlarında və s.)*
**ticker-tape** ['tıkəteıp] *n* teleqraf lenti
**ticket[1]** ['tıkıt] *n* 1. bilet; **railroad/ tram/ theatre/ concert ~** dəmiryol/tramvay/teatr/konsert bileti; **one-way ~** *amer.* birtərəfli bilet; **to take a ~ for the opera** operaya bilet almaq; **to take *one's* ~ for a London train** Londona gedən qatara bilet almaq; **to order/to reserve a ~** bilet sifariş etmək; 2. yarlıq *(qiymətini və s. göstərmək üçün malların üstünə yapışdırılan kağız)*; **price ~** qiymət yarlığı; 3. qəbz, talon, nömrə; **cloak-room ~** paltarasan nömrəsi; 4. vəsiqə, bilet; **member's ~** üzvlük bileti; 5. *d.d. hərb.* ordudan tərxis olunma haqqında şəhadətnamə; 6. elan *(kirayəyə/icarəyə vermək haq.)*; 7. *amer. d.d.* küçə hərəkətini pozmaq üstündə məhkəməyə çağırış vərəqəsi; 8. *amer.* seçkidə seçicilərin siyahısı; **general ~** ümumi siyahı; **to vote a ~** siyahıya səs vermək; 9. order *(müəyyən əməliyyat aparmaq üçün yazılı əmr)*: tələbnamə, sifariş; 10. plan; **to write *one's* own ~** həyatını planlaşdırmaq, gələcəyi üçün plan cızmaq
**ticket[2]** ['tıkıt] *adj* bilet; **a ~ collector** bilet yoxlayıcısı/ nəzarətçisi
**ticket[3]** ['tıkıt] *v* 1. yarlıq yapışdırmaq/vurmaq; 2. *amer.* biletlə təmin/təchiz etmək; *The booking-office tickets from ten Bilet kassası saat ondan işləyir/bilet satır*
**tickle[1]** ['tıkl] *n* qıdıq, qıdıqlama; **to give *smb.* a ~** bir kəsi qıdıqlamaq
**tickle[2]** ['tıkl] *v* 1. qıdıqlamaq; **to ~ *smb.*** bir kəsi qıdıqlamaq; 2. ayışmaq, gicişmək; *My nose tickles Mənim burnum gicişir*; 3. zövq vermək; 4. sevinmək, könlü açılmaq; **to be ~d to death** şadlığından yerə-göyə sığmamaq; **to ~ to death** çox güldürmək, gülməkdən öldürmək; 5. əl ilə tutmaq *(balığı)*
**tickler** ['tıklə'] *n* 1. çətinlik, çətin/ağır vəziyyət; 2. çətin məsələ
**ticklish** ['tıklıʃ] *adj d.d.* 1. güləyən; qıdığı tutan /gələn; 2. küsəyən, tez küsən, dəymədüşər; 3. çətin, müşkül; **a ~ question** çətin /müşkül məsələ
**tick-tack** ['tık'tæk] *n* 1. çıqqıltı, taqqıltı; çıqqıldama, taqqıldama; 2. ürək döyüntüsü/səsi
**tidal** [taıdl] *adj* qabarma; **~ wave** qabarma dalğası, ləpə; **~ basin** qabarma hövzəsi
**tidbit** ['tıdbıt] *n* dadlı/yağlı tikə

**tiddler** ['tɪdlə$^r$] *n d.d.* balaca balıq, balıqcıq
**tiddly** ['tɪdlı] *adj* kiçicik, bambalaca
**tide**$^1$ [taɪd] *n* **1.** qabarma və çəkilmə *(dəniz suyu haq.)*; **high** ~ qabarma; **low** ~ çəkilmə; *The tide is coming in Qabarma başlayır*; **2.** sel, axın: istiqamət; **3.** hadisə, əhvalat; hadisələrin gedişi; *The tide has turned Hadisələr başqa səmtə yönəlib*; **to go with the** ~ *məc.* axınla getmək; **to turn the** ~ hadisələrin gedişini dəyişmək/ məcrasını dəyişdirmək; **to go against the** ~ axının əksinə getmək, axına qarşı getmək; **4.** *məc.* kütlə, izdiham, axın; dalğa; **the ~ of public discontent** xalqın qəzəb/hiddət dalğası; **5.** *d.d.* vaxt, zaman; dövr, müddət; **6.** *şair.* dərya, ümman; **double** ~ çox gərgin; qəzəblə, hiddətlə; **to work double ~s** gecə-gündüz çalışmaq; yorulmadan /gərgin işləmək
**tide**$^2$ [taɪd] *v (adət.* **to ~ over) 1.** öhdəsindən gəlmək, dəf etmək, aradan qaldırmaq; aşmaq *(mənəvi)*; **to ~ over a difficulty** çətinliyi aradan qaldırmaq; çətinliyi dəf etmək; **2.** çatmaq, kifayət etmək; *Will ten dollars tide you over till Saturday? Şənbə gününə qədər sənə/sizə on dollar bəs edərmi? This will tide us over till spring Bu, yaz açılanadək bizə çatar/kifayət edər*
**tide-waiter** ['taɪd,weɪtə$^r$] *n* liman gömrükxanası məmuru
**tidewater** ['taɪd,wɔ:tə$^r$] *n* qabarma suyu
**tideness** ['taɪdnɪs] *n* səliqə, səliqəlilik, təmizkarlıq
**tidings** ['taɪdɪŋz] *n pl* xəbərlər, yeniliklər; xəbər, yenilik, məlumat; **good** ~ yaxşı xəbər; **evil** ~ pis/bəd xəbər; **to bring** ~ xəbər gətirmək; **to receive** ~ xəbər almaq
**tidy**$^1$ ['taɪdı] *adj* **1.** səliqəli, təmizkar, təmiz, sahmanlı; **a ~ room** səliqəli/təmiz otaq; **a ~ person** təmizkar/ səliqəli adam; *He is a tidy person O, səliqəli adamdır; She keeps her house very tidy O, evini çox təmiz/sahmanlı/ səliqəli saxlayır*; **2.** *d.d.* xeyli, böyük, çox; **a ~ sum** böyük məbləğ; *He donated a tidy sum of money O, böyük məbləğdə pul yardımı göstərdi/ianə verdi*
**tidy**$^2$ ['taɪdı] *v* səliqəyə/sahmana salmaq, yığışdırmaq, təmizləmək, sahmanlamaq; **to ~ a room** otağı yığışdırmaq/sahmana salmaq; **to ~ the papers on the desk** stolun üstündəki kağızları sahmana salmaq; **to ~ *one's* hair** saçını səliqəyə salmaq
**tie**$^1$ [taɪ] *n* **1.** rabitə; qovuşuq, düyün; **2.** *(adət. pl)* buxov; bağ, tel, bənd, əlaqə; **the ~s of friendship** dostluq telləri/əlaqələri; **trade ~s** ticarət əlaqələri; **family ~s** ailə əlaqələri; **blood ~s** qan əlaqələri/ qohumluğu; **3.** qalstuk; **to wear a ~** qalstuk taxmaq; **4.** borc, öhdəlik; **the ~ of patriotism** vətənpərvərlik borcu; **a man free from bonds and ~s** heç bir öhdəliyi/borcu olmayan adam; **5.** əzab, əziyyət; **6.** *id.* heç-heçə oyun; **to end in a ~** heç-heçə qurtarmaq
**tie**$^2$ [taɪ] *v (pt, pp* **tied**; *pr.p* **tying) 1.** bağlamaq; düyünləmək, bənd etmək; qaytanlamaq; **to ~ *one's* shoes** ayaqqabılarının ipini bağlamaq; *The prisoner's hands were tied together Dustağın əlləri bağlı idi*; **2.** sarımaq, sarğı bağlamaq; **3.** bitişdirmək; möhkəmlətmək; **4.** əlaqələndirmək; **5.** məcbur etmək; öhdəsinə qoymaq; **6.** şərtləndirmək; şərtlə məhdudlaşdırmaq; **7.** *id.* hesabı bərabərləşdirmək; heç-heçə oynamaq; *The teams tied Komandalar heç-heçə oynadılar*; **to ~ the score** hesabı bərabərləşdirmək; *The score is tied Hesab bərabərdir*; **to ~ in** birləşdirmək, qoşmaq; **to ~ up** əlaqələndirmək; bağlamaq; *I don't tie it up Bu mənim yadıma heç nə salmır*; **to ~ up a watchman** gözətçinin əl-qolunu bağlamaq; *Everything is tied up now İndi hər şey həll olunub*; **8.** sərbəst fəaliyyəti məhdudlaşdırmaq; maneçilik törətmək, mane olmaq; **to be ~d up** *d.d.* **1)** ərə getmək, evlənmək; **2)** *məc.* başı bağlı olmaq; **9.** uyğun gəlmək/olmaq, düz /tən gəlmək; üst-üstə düşmək; *It ties up with what you were told before Bu sənə/sizə əvvəllər deyilənlə uyğun gəlir*; **10. (with)** səyləri birləşdirmək; sıx birləşmək; **11.** işi dayandırmaq; tətil etmək
**tier** [taɪə$^r$] *n* **1.** bağlayan, sarıyan *(adam)*; **2.** bərkitmə, bağlama; **3.** sıra, cərgə; **4.** *amer.* uşaq önlüyü/ döşlüyü
**tierce** [tɪəs] *n* **1.** boçka, çəllək; **2.** *id.* üçüncü mövqe və müdafiə *(qılıncoynatmada)*; **3.** eyni rəngli üç ardıcıl kart *(kart oyununda)*
**tie-wig** ['taɪwɪg] *n arx.* parik *(qoyma saç, arxadan lentlə bağlanan)*
**tiff** [tɪf] *n* inciklik, küsmə, incimə; **small** ~ kiçicik inciklik/küsüşmə
**tiffany** ['tɪfənı] *n toxuc.* nazik /qaz-qaz ipək parça, şəffaf ipək örtük
**tig**$^1$ [tɪg] *n* **1.** toxunma, dəymə, əl vurma; **2.** qaçdı-tutdu *(uşaq oyunu)*; **to play (at) ~** qaçdı-tutdu oynamaq; **3.** dalaşma, vuruşma, dava, qovğa; **to be in a ~** küsüşmək, arası dəymək
**tig**$^2$ [tɪg] *v* **1.** yağlamaq, yağ çəkmək, piy sürtmək; **2.** toxunmaq, dəymək, təmas etmək
**tiger**$^1$ ['taɪgə$^r$] *n* **1.** *zool.* pələng; **red ~** kuquar, puma *(Amerikada yaşayan vəhşi pişik)*; **2.** qorxulu rəqib *(idman oyunlarında)*; **3.** davakar, dalaşqan, sataşqan
**tiger**$^2$ ['taɪgə$^r$] *adj* pələng; **~ skin** pələng dərisi
**tigerish** ['taɪgərɪʃ] *adj* **1.** pələng, pələng kimi; **~ stripes** pələng kimi zolaqlı; **2.** yırtıcı, mərhəmətsiz, qəddar, zalım; qeyzli, hiddətli; **3.** pələng çox olan yer; **the ~ section of the jungle** pələng çox olan cəngəllik bölməsi
**tight**$^1$ [taɪt] *adj* **1.** sıx; bərk; yumulmuş, düyülmüş; **~ quarters** sıx otaq, dar yer; **2.** sukeçirməyən; havakeçirməyən; **a ~ boat** sukeçirməyən qayıq; **3.** dar, ensiz *(paltar, ayaqqabı haq.)*; **a ~ shirt** dar köynək; *This jacket is tight across the shoulders Bu jaket çiyinlərdən dardır*; **4.** bərk, tarım; gərgin, tarım çəkilmiş; **a ~ knot** bərk düyün; **~ nerves** gərgin əsəb; **~ spring** tarıma çəkilmiş yay; **5.** çətin, ağır; **to be in a ~ place/corner** çətin vəziyyətdə olmaq; *The money is tight these days Bu günlərdə pul məsələsi bir qədər çətindir*; **6.** *d.d.* xəsis, simic, bərk; **7.** yığcam *(üslub və s. haq.)*; **8.** *d.d.* sərxoş, kefli; **~ as a drum** tamamilə sərxoş; **9.** ciddi, tələbkar; **~ control** ciddi nəzarət; **to keep a ~ hold on *smb.*** bir kəsdən bərk tutmaq/yapışmaq;
◊ **~ corner/place** çətin vəziyyət; **to keep *one's* mouth ~ shut** dilini sakit saxlamaq, susmaq; **to get *smb.* in a ~ corner** bir kəsi divara dirəmək/küncə sıxmaq; bir kəsi ağır vəziyyətə salmaq
**tight**$^2$ [taɪt] *adv* **1.** sıx, kip; **2.** bərk, tarım; möhkəm; **to sit ~** bərk durmaq, mövqeyini əldən verməmək; **to tie the knot ~** bərk düyünləmək; *Hold tight! Möhkəm tut/tutun! The windows were shut tight Pəncərələr bərk-bərk bağlanmışdı*; **3.** rahat, bərk; **to sleep ~** bərk yatmaq
**tighten** ['taɪtn] *v* **1.** sıxılmaq, sıxmaq, qısmaq; sıxlaşdırmaq, bərkitmək; **to ~ *one's* belt** kəmərini bərkitmək, qayışı bərk çəkmək; **2.** yumulmaq, yummaq; **3.** dartmaq, gərmək, tarımlamaq; **to ~ the brakes** əyləci dartıb nizamlamaq; **to ~ the strings of a violin** skripkanın simlərini dartıb kökləmək; **4.** *məc.* gücləndirmək, kəskinləşdirmək, ağırlaşdırmaq, sərtləşdirmək; **to ~ control** nəzarəti gücləndirmək; **to ~ the rules** qaydaları sərtləşdirmək; **to ~ upon discipline** nizam-intizamı gücləndirmək; **to ~ security** mühafizə tədbirlərini artırmaq; **to ~ restrictions** məhdudiyyətləri sərtləşdirmək/kəskinləşdirmək
**tight-fisted** ['taɪt'fɪstɪd] *adj* xəsis, simic, bərk, dargöz
**tight-lipped** ['taɪt'lɪpt] *adj* dinməz, danışmaz, azdanışan, qaradinməz
**tightness** ['taɪtnɪs] *n* **1.** gərginlik; **~ in the air** gərgin mühit, gərginlik şəraiti; **2.** *amer.* darısqallıq, basırıqlıq; sıxma, sıxılma; *I feel a tightness in my chest Sinəm /Ürəyim sıxılır*
**tightrope** ['taɪtroup] *n* tarım çəkilmiş kanat/buraz *(yoğun ip/kəndir)*
**tightrope-dancer** ['taɪtroup,da:nsə$^r$] *n* kəndirbaz
**tights** [taɪts] *n pl* **1.** triko *(yun parça)*, trikotaj idman paltarı; **2.** reytuz *(dar şalvar)*
**tightwad** ['taɪtwɔd] *n d.d.* çox xəsis/simic adam; zıqqı
**tigress** ['taɪgrɪs] *n* dişi pələng
**til** [tɪl] *n bot.* küncüt
**tilde** [tɪld] *n poliqr.* tilda *(ucuəyri xətt şəklində mətbəə işarəsi)*
**tile**$^1$ [taɪl] *n* **1.** kirəmit, sifal; **2.** kaşı; **3.** plitka *(dördbucaq şəklində olan hər cür yastı şey)*; **4.** *d.d.* şlyapa, silindr *(təpəsi hündür şlyapa)*
**tile**$^2$ [taɪl] *v* **1.** kirəmitləmək, kirəmitlə örtmək; **to ~ a roof** damı kirəmitlə örtmək; **2.** kaşı ilə örtmək; **to ~ a wall** divara kaşı vurmaq; **3.** örtmək, döşəmək; **to ~ the floor** döşəməyə plitka döşəmək
**tiled** [taɪld] *adj* **1.** kirəmitlə örtülmüş; **~ roof** kirəmitlə örtülmüş dam; **2.** üzərinə kaşı çəkilmiş/vurulmuş, kaşı ilə örtülmüş; **~ stove** üzərinə kaşı vurulmuş soba/peç; **3.** plitka ilə örtülmüş, üzərinə plitka çəkilmiş; **~ floor** üzərinə plitka çəkilmiş döşəmə
**tiler** ['taɪlə$^r$] *n* usta, sənətkar *(kirəmit düzən, kaşı döşəyən)*
**tilery** ['taɪlərı] *n* **1.** kirəmit zavodu; **2.** kirəmit bişirən peç/soba
**tiling** ['taɪlɪŋ] *n* kirəmit dam
**till**$^1$ [tɪl] *n* **1.** pul qutusu, kassa *(dükanda, bankda)*; **2.** *geol.* qaya gili; til
**till**$^2$ [tɪl] *v k.t.* torpaq becərmək/şumlamaq; **to ~ the soil** yer şumlamaq
**till**$^3$ [tɪl] *prep* **1.** -a, -ə, -ya, -yə; -dək, -can, -cən; **~ tomorrow** sabahacan, sabahadək; **2.** qədər, kimi; **~ then** o vaxta kimi; *He did not write (to) us till last week Keçən həftəyə qədər o bizə məktub yazmadı*; **from morning ~ night** səhərdən axşama kimi; *She is not coming till Sunday O, bazar gününə kimi gəlməyəcək*
**till**$^4$ [tɪl] *conj* -ca, -cə; -can, -cən; kimi, qədər, ta ki; *Wait till I come Mən gələnə kimi gözlə/gözləyin; You may stay here till he arrives O gələnə qədər sən /siz burada qala bilərsən/bilərsiniz*
**tillable** ['tɪləbl] *adj k.t.* əkinə/şuma yararlı; şumluq
**tillage** ['tɪlɪdʒ] *n* **1.** becərmə, becərilmə, torpağın becərilməsi; **2.** əkin yeri, şumlanmış yer, şum
**tiller**$^1$ ['tɪlə$^r$] *n* **1.** əkinçi; **2.** *amer.* kultivator *(torpaq yumşaldan maşın)*; dibdolduran *(maşın)*; **3.** *tex.* dəstə, qulp, tutacaq; qol, sap; **4.** *bot.* zoğ, cavan budaq
**tiller**$^2$ ['tɪlə$^r$] *v* zoğ buraxmaq; qol-budaq atmaq, şaxələnmək
**tilt**$^1$ [tɪlt] *n* **1.** əymə, əyilmə; maillik, meyl; **to give *smth.* a ~** bir şeyi əymək; **2.** dalaşma, vuruşma, qovğa, dava; çəkişmə, münaqişə; **3.** tent, günlük; yelkənli örtü *(arabanın, qayığın, alver budkasının üstündə)*; **4.** *amer.* təkbətək döyüş/vuruşma; duel; **5.** *amer.* yelləncək
**tilt**$^2$ [tɪlt] *v* **1.** əymək, əyilmək, meyl etmək; **to ~ *one's* head to one side** başını bir tərəfə əymək; **to ~ a chair backward** stulu dala əymək; *The table tilted suddenly Birdən stol əyildi*; **2.** çevrilmək, yıxılmaq; arxası üstə düşmək *(həm də* **to ~ over)**; **3.** qatlamaq, açmaq, qaldırmaq; çevirmək, döndərmək; **4.** *tar.* nizə ilə döyüşmək /vuruşmaq/hücum etmək; **5.** yelkənlə örtmək, bürümək; üstünə çəkmək/örtmək
**tilth** [tɪlθ] *n* **1.** torpağın becərilməsi; **2.** əkin yeri; şumlanmış yer; şum; **3.** şumlanmış layın dərinliyi
**tilt-hammer** ['tɪlt,hæmə$^r$] *n* quyruqlu gürz; böyük çəkic

**tilt-yard** [ˈtıltja:d] *n tar.* turnir meydanı, yarış sahəsi

**timber**[1] [ˈtımbə˞] *n* **1**. meşə materialı, taxta-şalban; tikintiyə yararlı ağac; **2**. tir, şalban; dirək; **3**. oduncaq; **the ~ of the oak** palıd oduncağı; **4**. şəxsi keyfiyyət/ ləyaqət; **a man of the right sort of ~** yüksək ləyaqətli insan; *He is good a presidential timber d.d. Onda prezidentliyə məxsus/xas bütün keyfiyyətlər vardır*; **5**. çəpər, hasar *(ov zamanı)*

**timber**[2] [ˈtımbə˞] *v* **1**. üzlük/üz vurmaq *(taxta, dəmir və ya başqa materialdan)*; **2**. dirəklərlə bərkitmək

**timbered** [ˈtımbəd] *adj* **1**. ağacdan/taxtadan qayrılmış; **2**. meşəli, meşəlik

**timber-headed** [ˈtımbəˈhedıd] *adj d.d.* səfeh, sarsaq, axmaq, başıboş, qanmaz; *He is timber-headed O, qanmazdır/gicdir*

**timber-land** [ˈtımbəlænd] *n* meşə sahəsi

**timber-line** [ˈtımbəlaın] *n* meşə sahəsinin yuxarı sərhədi

**timber-yard** [ˈtımbəja:d] *n* odun yığını; meşə materialı anbarı

**timbre** [ˈtımbə˞] *n fr. mus.* tembr *(səs xüsusiyyəti)*

**timbrel** [ˈtımbrəl] *n* dəf, qaval

**time**[1] [taım] *n* **1**. vaxt, zaman, çağ; **from ~ to ~** hərdənbir, bəzən; **in ~** vaxtında, məqamında; **to be in ~** vaxtında gəlmək/yetişmək/çatmaq; **out of ~** vaxtsız, yersiz; **to have a good ~** vaxtını yaxşı keçirmək; **in good ~** düz vaxtında; **all in good ~** hər şey öz vaxtında; **to keep good ~** yaxşı işləmək *(saat)*; **to keep bad ~** pis işləmək *(saat)*; **in no ~** tez, dərhal; **in a short ~** tezliklə, qısa bir müddətdə/ vaxtda; **for a short ~** qısa müddətə; **to bear the test of ~** zamanın sınağına dözmək; *Time flies Vaxt uçur;* **at one ~** vaxtilə, bir vaxtlar; çoxdan; **at ~s** bəzən, hərdənbir, arabir; **some ~ or other** bir zaman, bir vaxt; **at no ~** heç bir vaxt/vədə; **at the same ~** eyni zamanda/vaxtda; bununla belə; **for the ~ being** hələlik, bir vaxtadək; **2**. müddət, vaxt; vədə, möhlət; *It is time we were going Getmək vaxtıdır; Time is up Vaxt qurtarıb, Müddət bitib;* **to do ~** *d.d.* həbs cəzası çəkmək; **to serve *one's* ~** xidmət müddətini qurtarmaq; cəza müddətini çəkmək; *She is near her time Onun tezliklə uşağı olacaq*; **to work against ~** vaxtında bitirməyə/ tamamlamağa çalışmaq; **3**. *pl* dövr, zaman; **hard ~s** ağır zamanlar; **Shakespeare's ~s** Şekspir dövrü; **before *one's* ~** anadan olanadək; **as ~s go** indiki zamanda; **4**. iş vaxtı; **to work full/part ~** tam /yarımştat işləmək; **5**. həyat, ömür; əsr; *It will last my time Mənim ömrümə bəsdir*; **at my ~ of life** mənim yaşımda, ömrüm müddətində; **6**. dəfə; *Six times five is thirty Altı dəfə beş otuz eylər*; **ten ~s as large** on dəfə artıq/çox; **~ after ~** dəfələrlə, təkrarən; **many a ~** tez-tez, dəfələrlə;

◊ *It beats my time Mən bunu dərk edə bilmərəm;* **to sell ~** *amer.* radio və ya televiziya ilə çıxış etmək üçün vaxt vermək; *Lost time is never found at. söz. Ötən gün geri qayıtmaz; Take your time! Tələsmə! Tələsməyin!* **to kill ~** vaxtı boş keçirmək, vaxtı öldürmək; **to go with the ~s** həyatdan geri qalmamaq, zəmanə ilə ayaqlaşmaq

**time**[2] [taım] *v* **1**. vaxt tapmaq; **2**. vaxtı hesablamaq; **to ~ to the minute** hər dəqiqəni hesablamaq; **3**. vaxt təyin etmək; *The train timed to leave at 6.30 Qatar saat 6.30-da yola düşdü*; **4**. *id.* vaxtı göstərmək *(qaçış/yürüş zamanı)*; **5**. taktla rəqs etmək, taktı tutmaq

**time-and-a-half** [ˈtaıməndəˈha:f] *n* əlavə iş vaxtının yarımçıq həcmdə ödənilməsi

**time-bargain** [ˈtaım.ba:gın] *n* vaxtında sövdələşmə; təcili sövdələşmə

**time bomb** [ˈtaımbɔm] *n hərb.* gec açılan bomba

**time-book** [ˈtaımbuk] *n* = **time-card**

**time-card** [ˈtaımka:d] *n* işə gəlmə və işdən getmə kartoçkası

**time-clock** [ˈtaımklɔk] *n* saat-tabel

**time-consuming** [ˈtaımkənˈsju:mıŋ] *adj* çox vaxt aparan *(iş, məşğuliyyət və s.)*

**time-expired** [ˈtaımıks.paıəd] *adj hərb.* qulluq/xidmət müddətini bitirmiş/qurtarmış

**time-exposure** [ˈtaımıks.pouʒə˞] *n fot.* ekspozisiya *(fotoaparatla şəkil çəkdikdə obyektivin açıq qalma müddəti)*

**time-fire** [ˈtaım.faıə˞] *n hərb.* distansiya atışı, məsafədən atış

**time-honoured** [ˈtaım.ɔnəd] *adj* əsrlərlə əziz tutulan

**timekeeper** [ˈtaım.ki:pə˞] *n* **1**. tabelçi, tabelə baxan; **2**. xronometr *(çox dəqiq saat)*; **3**. *id.* hakim-xronometr *(saniyəölçənlə vaxtı qeyd edən hakim)*

**timeless** [ˈtaımlıs] *adj* **1**. vədəsiz, vaxtsız, yersiz; **~ death** vaxtsız ölüm; **2**. müəyyən müddətə aid olmayan, müddətsiz; **3**. *şair.* əbədi, həmişəlik, daimi

**timeliness** [ˈtaımlınıs] *n* vaxtlı-vaxtında olma

**timely** [ˈtaımlı] *adj* vaxtında, vaxtında olan; **~ aid** vaxtında olan kömək

**time-out** [ˈtaımˈaut] *n* tənəffüs, fasilə, ara *(işdə, idman oyunlarında və s.)*

**timepiece** [ˈtaımpi:s] *n* saat; xronometr

**timer** [ˈtaımə˞] *n* **1**. xronometrist *(at yarışında, cıdırda)*; **2**. saat; xronometr; **3**. *tex.* taymer *(vaxt tənzimləyicisi)*

**time-saving** [ˈtaım.seıvıŋ] *adj* vaxta qənaət edən; **a ~ device** vaxta qənaət edən mexanizm

**time-server** [ˈtaım.sə:və˞] *n* ikiüzlü/hər bir şəraitə uyğunlaşan adam; opportunist; zəmanə adamı

**time-serving** [ˈtaım.sə:vıŋ] *n* ikiüzlülük, hər bir şəraitə uyğunlaşma

**time-signal** [ˈtaım.sıgnl] *n* vaxt siqnalı; vaxtın yoxlanılması

**time-study** [ˈtaım.stʌdı] *n* xronometraj *(əmək proseslәri müddətinin saniyəölçən vasitəsilə dəqiq ölçülməsi)*



**time-table** [ˈtaım.teıbl] *n* **1**. cədvəl *(dərs, dəmiryol və s.)*; **a school ~** dərs cədvəli; **2**. qrafik *(işin, hərəkətin və s.)*

**time-work** [ˈtaımwə:k] *n* günəmuzd iş

**time-worker** [ˈtaım.wə:kə˞] *n* günəmuzd, günəmuzd işçi

**time-worn** [ˈtaımwɔ:n] *adj* geyilmiş, köhnəlmiş, nimdaş; köhnə

**timid** [ˈtımıd] *adj* qorxaq, ağciyər, cəsarətsiz, ürəksiz; utancaq; **as ~ as a rabbit** dovşan kimi qorxaq

**timidity** [tıˈmıdıtı] *n* qorxaqlıq, ürəksizlik, cəsarətsizlik, ağciyərlik; utancaqlıq

**timidly** [ˈtımıdlı] *adv* qorxaqcasına, cəsarətsizcəsinə

**timorous** [ˈtımərəs] *adj* qorxaq, ağciyər, qorxacaq, çox cəsarətsiz

**timothy** [ˈtıməθı] *n bot.* pişikquyruğu *(həm də ~* **grass***)*

**tin**[1] [tın] *n* **1**. qalay; **2**. tənəkə, ağ dəmir; **3**. qalay qab/qab-qacaq; **4**. tənəkə qab/qutu; konserv bankası; **a ~ of sardines** bir banka sardina; **5**. *d.d.* pul; sərvət, dövlət;

◊ **straight from the ~** təptəzə, təzəcə

**tin**[2] [tın] *adj* **1**. qalaylı; qalaydan qayrılmış, tərkibində qalay olan; **2**. qəlp, saxta; süni; **~ lizzie** *amer.* ucuz avtomobil, kiçik ford maşını; **~ wedding** qalay toy *(toyun onuncu ildönümü)*

**tin**[3] [tın] *v* **1**. qalaylamaq, qalayla örtmək; **2**. konservləşdirmək, konserv hazırlamaq; **to ~ fruit/fish** meyvəni/balığı konservləşdirmək

**tinctorial** [tıŋkˈtɔ:rıəl] *adj* boyayıcı, boyayan; boyaqçı

**tincture**[1] [ˈtıŋktʃə˞] *n* **1**. məhlul, qatışıq; **2**. çalar, çalarlıq; **with a ~ of red** qırmızı çalarlı; **3**. tinktura *(suda, spirtdə və ya efirdə hazırlanmış dərman maddəsi)*

**tincture**[2] [ˈtıŋktʃə˞] *v* **1**. yüngülcə/üzdən boyamaq; **2**. çalar vermək

**tinder** [ˈtındə˞] *n* **1**. *bot.* ağacgöbələyi; **2**. çürümüş quru ağac

**tindery** [ˈtındərı] *adj* tez alovlanan, asanlıqla yanan

**tine** [taın] *n* diş *(mişarda, daraqda, dırmıqda, çarxda və s.)*

**tinge**[1] [tındʒ] *n* **1**. yüngül rəng; çalar, çalarlıq; **2**. iz, ünsür; qatışıq

**tinge**[2] [tındʒ] *v* yüngülcə boyamaq, çalar / rəng vermək

**tingle**[1] [ˈtıŋgl] *n* cingilti, qulaq cingiltisi; sancma

**tingle**[2] [ˈtıŋgl] *v* **1**. sancmaq, arabir sancmaq; cingildəmək *(qulaq)*; səslənmək; *The reply tingled in my ears Cavab hələ də mənim qulaqlarımda cingildəyirdi*; **2**. **(with)** qızarmaq, qıpqırmızı olmaq *(utancaqlıqdan, qəzəbdən, hiddətdən)*; **3**. əsmək, titrəmək, səyrimək; **to ~ with excitement** həyəcandan titrəmək; *My cheeks are tingling Mənim yanaqlarım səyriyir*;

**tinhorn**[1] [ˈtınhɔ:n] *n amer. d.d.* lovğa, gopçu, özünü öyən *(adam)*

**tinhorn**[2] [ˈtınhɔ:n] *adj* zahiri, süni, yalançı; əhəmiyyətsiz, bayağı

**tinker**[1] [ˈtıŋkə˞] *n* **1**. misgər, qalayçı; **2**. pis/ bacarıqsız işçi; **3**. bir təhər təmir etməyə cəhd etmə; *I don't care a tinker's damn Mənim heç vecimə deyil; It is not worth a tinker's damn Qara qəpiyə də dəyməz*

**tinker**[2] [ˈtıŋkə˞] *v* **1**. qalaylamaq, lehimləmək; **2**. bir təhər/necə gəldi təmir etmək; qurdalanmaq, əlləşmək; *He is tinkering with the car/the radio O, maşınla əlləşir/radionu qurdalayır*

**tinkle**[1] [ˈtıŋkl] *n* zəng səsi, zanqıltı *(metal əşyaların bir-birinə dəyməsi ilə əmələ gələn cingilti/cingildəmə); I'll give you a tinkle tomorrow Sabah sənə/sizə bir zəng çalaram*

**tinkle**[2] [ˈtıŋkl] *v* cingildəmək, cingildətmək; zanqıldamaq, danqıldamaq; *He tinkled the bell O, zəngi cingildətdi/çaldı; The door bell tinkled Qapının zəngi çalındı*

**tinkler** [ˈtıŋklə˞] *n* **1**. *d.d.* zınqırov, zəng; **2**. misgər, qalayçı

**tinman** [ˈtınmən] *n* tənəkəçi; qalayçı

**tinned** [ˈtınd] *adj* **1**. konservləşdirilmiş; **~ goods** konservləşdirilmiş mallar, konservlər; **2**. qalayla örtülmüş, qalay təbəqəsi çəkilmiş

**tinner** [ˈtınə˞] *n* **1**. qalay mədəni fəhləsi; **2**. konserv zavodu fəhləsi

**tinny** [ˈtını] *adj* **1**. tərkibində qalay olan, qalaylı; **2**. tənəkə ünsürlü, tənəkə izi olan; **3**. metal səsi verən, metal zınqıltısı çıxaran

**tin-opener** [ˈtıŋ.oupnə˞] *n* konserv bıçağı, konservaçan *(alət)*

**tin-pan** [ˈtınpæn] *adj* metal səsi, kəskin /pis səs; qulaqbatıran *(musiqi haq.)*

**tin-plate**[1] [ˈtınpleıt] *n* ağ tənəkə, ağ dəmir

**tin-plate**[2] [ˈtınpleıt] *v* qalaylamaq

**tinsel**[1] [ˈtınsəl] *n* **1**. parıltı, işıltı; zahiri bəzək/bərbəzək; **2**. parıltılı/parıldayan parça

**tinsel**[2] [ˈtınsəl] *adj* saxta, zahiri, yalançı

**tinsel**[3] [ˈtınsəl] *v* **1**. zahirən bəzəmək/bər-bəzək vurmaq; **2** süni parıltı vermək

**tinsmith** [ˈtınsmıθ] *n* **1**. tənəkəçi; **2**. qalayçı

**tinstone** [ˈtınstoun] *n* qalay daşı

**tint**[1] [tınt] *n* **1**. rəng, boya; çalar, ton; **~ of yellow** sarı çalar; **2**. solğun, rəngi ağarmış; açıq, açıq rəngli

**tint**[2] [tınt] *v* azca/yüngülcə rəngləmək, azca boyamaq; rəngini təzələmək/dəyişmək

**tintinnabulation** [ˈtıntı.næbjuˈleıʃn] *n* zəng səsi; zanqıltı, danqıltı

**tintometer** [tınˈtɔmıtə˞] *n tex.* kolorimetr *(rəngli məhlulun konsentrasiya miqdarını təyin edən cihaz)*

**tintype** [ˈtıntaıp] *n fot.* ferrotipiya *(metal üzərində fotoalma)*

**tinware** [ˈtınweə˞] *n* tənəkə məmulatı; qalay qab-qacaq

**tiny¹** [ˈtaını] *n* balaca uşaq, körpə; *When they were tinies... Onlar körpə olanda...*

**tiny²** [ˈtaını] *adj* çox balaca/xırda, kiçicik, bambalaca; ~ **hands** çox balaca/xırda əllər

**tip¹** [tıp] *n* **1.** uc, axır, son; *I had it on the tip of my tongue O mənim dilimin ucunda idi;* **to walk on the ~s of *one's* toes** ayaq barmaqlarının ucunda yerimək; **to touch with the ~s of *one's* fingers** barmaqlarının ucu ilə toxunmaq; **2.** ucluq; **the ~ of a spear/of an umbrella** nizənin/çətirin ucluğu; **3.** təpə, baş, üst, üst tərəf; **from ~ to toe** başdan ayağa kimi; **4.** yüngül zərbə, itələmə; **5.** maillik, yatıqlıq; **6.** zibillik, zibil tökülən yer, zibilxana; **7.** *amer.* çaypulu, bəxşiş; **to give someone a ~** bir kəsə çaypulu vermək; **8.** *amer.* məsləhət, məşvərət; *Take my tip Mənim məsləhətimə qulaq as/asın;* **to give a ~** işarə etmək, söz atmaq, kinayə etmək

**tip²** [tıp] *v* (-pp-) **1.** ucluq geyindirmək, ucluq əlavə etmək; **2.** uclarını kəsmək *(kolun, ağacın və s.)*; **3.** əyilmək, meyl etmək; *The boat tipped Qayıq əyildi/yana meylləndi;* **4.** təzədən/yenidən çəkmək *(tərəzidə)*; **to ~ the scales** tərəzinin gözünü əymək; **5.** yüngül zərbə vurmaq, yüngülcə toxunmaq; **6.** çevirmək, geriyə atmaq, mövqeyindən çıxartmaq; **7.** dala qatlanmaq; dala qatlamaq; **to ~ up a seat** oturacağı dala/geri qatlamaq; **8.** çaypulu vermək; **9.** xüsusi məlumat vermək; **10.** xəbərdarlıq etmək; qabağını almaq, çəkindirmək;

◊ **to ~ *smb.* a/the wink** bir kəsə xəlvəti/xəlvətcə göz vurmaq

**tip-and-run** [ˈtıpəndˈrʌn] *n* ildırım sürətli hücum və sonra geri çəkilmə; vurub qayıtma

**tiplorry** [ˈtıpˈlɔrı] *n* özüboşaldan yük maşını

**tip-off** [ˈtıpɔf] *n d.d.* işarə, eyham; **to give a ~** işarə etmək, eyham vurmaq, vaxtında xəbərdarlıq etmək

**tip-over** [ˈtıp.ouvəʳ] *adj* çevrilən, arxaya qatlanan

**tipper** [ˈtıpəʳ] *n* özüboşaldan maşın

**tipple¹** [ˈtıpl] *n* **1.** spirtli içki; **2.** *d.d.* içki; **3.** *amer.* qəbul meydançası

**tipple²** [ˈtıpl] *v* sərxoşluq/əyyaşlıq etmək, çox içmək

**tippler** [ˈtıpləʳ] *n* əyyaş, içki düşkünü

**tippy** [ˈtıpı] *adj d.d.* möhkəm olmayan, dayanıqsız *(əşya haq.)*

**tipster** [ˈtıpstəʳ] *n* hərif; kələkbaz, fırıldaq *(cıdırda, idman oyunlarında və s.)*

**tipsy** [ˈtıpsı] *adj d.d.* yüngülcə içmiş, azca vurmuş; **a ~ lurch** qətiyyətsiz yeriş, qeyri-sabit yeriş/hərəkət

**tiptoe¹** [ˈtıptou] *n* ayaq barmaqlarının ucu (ucları); **on ~** ayaqlarının ucunda; xəlvətcə, gizlicə; **to be on ~ with curiosity** maraqdan yanmaq, çox/həddən artıq maraq göstərmək

**tiptoe²** [ˈtıptou] *v* **1.** ayaq barmaqlarının ucunda gəzmək/yerimək; **2.** yavaş-yavaş /gizlincə /xəlvəti yaxınlaşmaq

**tiptop¹** [ˈtıpˈtɔp] *n* **1.** ən yüksək/əla səviyyə; son həddi; **2.** ən yüksək nöqtə, təpə; **the ~ of a mast** dor ağacının ən yüksək nöqtəsi/təpəsi

**tiptop²** [ˈtıptɔp] *adj d.d.* üstün, artıq; əla, çox yaxşı

**tiptop³** [ˈtıpˈtɔp] *adv* çox gözəl/yaxşı, əla

**tip-truck** [ˈtıptrʌk] *n* = **tiplorry**

**tirade** [taıˈreıd] *n* tirada *(coşğun və təsirli söyləniləN nitq)*

**tirailleur** [.ti:raıˈə:ʳ] *n fr.* snayper *(mahir/sərrast nişançı)*

**tire¹** [taıəʳ] *n* **1.** *d.d.* papaq, baş örtüyü; **2.** şin; təkər qurşağı, dəmir və ya rezin çənbər

**tire²** [taıəʳ] *v* **1.** geyindirmək, geyindirib-keçindirmək, bəzəmək; **2.** yormaq, üzmək, əldən salmaq; **3.** təngə gətirmək, darıxdırmaq, tıncıxdırmaq

**tired¹** [taıəd] *adj* yorğun, yorulmuş; **~ out** əldən/haldan/tabdan düşmüş, tabsız; **to be ~** yorulmaq; *I am tired to the bone Mən çox bərk yorulmuşam; I am tired of waiting Mən gözləməkdən yorulmuşam; I am tired of doing the same thing Eyni işi görməkdən mən zara gəlmişəm*

**tired²** [taıəd] **to tire** *felinin pt, pp formaları*

**tireless** [ˈtaıəlıs] *adj* yorulmaz, yorulmaq bilməyən, zəifləməyən

**tiresome** [ˈtaıəsəm] *adj* **1.** zəhlətökən, təngəgətirən, zəhləaparan, bezikdirici, darıxdırıcı; **a ~ child** zəhlətökən/təngəgətirən uşaq; **2.** cansıxıcı, maraqsız; usandırıcı, ürəksıxan; **a ~ work** maraqsız /cansıxıcı iş

**tirewoman** [ˈtaıə.wumən] *n (pl* **-women** [-.wımın]) *d.d.* kameristka *(keçmişdə xanımların xüsusi xidmətində olan qulluqçu)*

**tiring¹** [ˈtaıərıŋ] *adj* yorucu, üzücü, darıxdırıcı; **a ~ work** yorucu iş

**tiring²** [ˈtaıərıŋ] **to tire** *felinin pr. p forması*

**tiring-room** [ˈtaıərıŋrum] *n d.d.* **1.** artistin tualet otağı *(teatrda)*; **2.** ayaqyolu

**tissue** [ˈtıʃu:; ˈtısju:, ˈtıʃju:] *n* **1.** parça, qumaş; **2.** *biol.* toxuma; **muscle ~** əzələ toxuması; **nerve ~** əsəb toxuması; **3.** hörümçək toru; şəbəkə; tor, hörülmə, sarınma; **a ~ of lies** yalan toru

**tissue-paper** [ˈtıʃu:.peıpəʳ] *n* **1.** papiros kağızı; **2.** kosmetik kağız; **3.** nazik sarğı kağızı; **4.** əlsilən, kağız dəsmal

**tit** [tıt] *n* **1.** *zool.* arıquşu; **2.** *d.d.* yabı; **3.** *d.d. kob.* qız

**Titan** [ˈtaıtən] *n* **1.** titan *(qədim yunan əsatirində: allahlarla vuruşan div)*; **2.** *məc.* dahi, nəhəng, bahadır; **~s of science** elm dahiləri/bahadırları

**titanic** [taıˈtænık] *adj* **1.** əzəmətli, möhtəşəm, qüvvətli, qüdrətli, nəhəng; **~ energy** nəhəng enerji; **2.** *kim.* titan, titandan qayrılmış; **~ acid** titan turşusu, titandan qayrılmış turşu

**titanium** [taıˈteınjəm] *n kim.* titan *(ağ rəngli bərk metal; kimyəvi element)*

**titbit** [ˈtıtbıt] *n* **1.** dadlı/ləzzətli tikə; *She always keeps some titbits to give to her cat O həmişə pişiyinə vermək üçün ləzzətli bir tikə saxlayır;* **2.** maraqlı xəbər; **~s of scandal** dava-dalaş haqqında maraqlı xəbərlər



**tithe¹** [taıð] *n* **1.** onda bir hissə; **2.** *tar.* desyatin *(1,092 hektara bərabər yer ölçüsü)*; **3.** *d.d.* bir zərrə/damcı/ qətrə, azacıq

**tithe²** [taıð] *v* vergi qoymaq, vergiyə cəlb etmək *(kilsə torpaqlarını)*

**titillate** [ˈtıtıleıt] *v* qıdıqlamaq; qıcıqlandırmaq; həvəsləndirmək, həvəsə gətirmək; **to ~ senses** hissləri qıcıqlandırmaq

**titivate** [ˈtıtıveıt] *v* bəzəmək, bəzək vermək, bəzək-düzək vermək; bəzənmək, özünə bəzək vermək

**titlark** [ˈtıtla:k] *n zool.* balaca dəniz quşu

**title¹** [ˈtaıtl] *n* **1.** sərlövhə, başlıq, ad; **2.** titul, ad, rütbə, vəzifə; **3.** hüquq, haqq, ixtiyar; **4.** *hüq.* mülkiyyət hüququ; mülkiyyət hüququ verən sənəd; **5.** *id.* çempion adı; **the heavyweight ~** ağırlıq qaldırmaq üzrə çempion adı; **6.** titr *(kino şəkillərində: məzmuna aid yazı)*

**title²** [ˈtaıtl] *v* **1.** sərlövhə/başlıq vermək, adlandırmaq; **2.** titul/ad/rütbə vermək; **3.** titrlə təmin etmək

**titled** [ˈtaıtld] *adj* **1.** titullu, ünvanlı; **2.** adlandırılmış, ad/ləqəb verilmiş

**title-deed** [ˈtaıtldi:d] *n hüq.* mülkiyyət hüququnu təsdiqləyən sənəd

**title-holder** [ˈtaıtl.houldəʳ] *n id.* çempion

**titleless** [ˈtaıtllıs] *adj* **1.** adsız, titulsuz, adı/titulu olmayan; **2.** sərlövhəsiz, sərlövhəsi olmayan; **3.** *hüq.* hüquqi əsasını itirmiş

**title-page** [ˈtaıtlpeıdʒ] *n poliqr.* titul vərəqi

**titmouse** [ˈtıtmaus] *n zool. (pl* **-mice** [-maıs]) arıquşu

**titter¹** [ˈtıtəʳ] *n* istehza ilə / bığaltı gülmə; hırıldama, hırıltı

**titter²** [ˈtıtəʳ] *v* istehza ilə/bığaltı gülmək, irişmək

**tittle** [ˈtıtl] *n* **1.** ən xırda hissəcik; **2.** *arx.* diakritik işarə *(hərflərin səsini dəyişdirmək üçün onların üstündə və ya altında qoyulan işarə)*

**tittle-tattle¹** [ˈtıtl.tætl] *n* qeybət, dedi-qodu, xəbərçilik; cəfəngiyyat, boşboğazlıq, boş danışıq/söhbət

**tittle-tattle²** [ˈtıtl.tætl] *v* xəbərçilik etmək, söz gəzdirmək, qeybət etmək, dedi-qodu ilə məşğul olmaq

**titular¹** [ˈtıtjuləʳ] *n* nominal olaraq titulu (rütbəsi) olan şəxs, yalnız kağız üzərində vəzifəsi olan şəxs

**titular²** [ˈtıtjuləʳ] *adj* **1.** titulu olan, titullu, rütbəli; **2.** adı olub özü olmayan, ancaq kağız üzərində olan, yalnız adı olan; *Most modern kings are only titular heads of government Müasir krallaların əksəriyyəti yalnız adı olan hökumət başçılarıdır*

**tizzy** [ˈtızı] *n* həyəcan, təşviş, təlaş; **to be/to get oneself into a ~** həyəcanlanmaq, təşvişə/həyəcana /çaxnaşmaya duşmək; əsəbiləşmək; çaxnaşmaq

**to¹** [tu:; tu; tə] *prep.* **1.** *Azərbaycan türkcəsinə yönlük hal şəkilçiləri (-a, -ə, -ya, -yə) vasitəsilə tərcümə edilir. Bu halda aşağıdakı mənaları ifadə edir:* **1)** *istiqamət:* to go **to** school məktəbə getmək; to go **to** London **Londona** getmək; to turn **to** the right **sağa** dönmək; *The windows look to the East Pəncərələr Şərqə baxır;* **2)** *hərəkətin məqsədini:* **to** the rescue **köməyə**; **to** that end bu **məqsədlə**; **3)** *qohumluq, xidməti tabeçilik və s.: He has been a good father to them O onlara yaxşı ata olub;* secretary **to** the director **direktorun** katibəsi; assistant **to** the professor **professorun** assistenti; **4)** *yaxınlıq, təmas:* shoulder **to** shoulder çiyin-çiyinə; face **to** face üz-üzə; **5)** *hərəkətin bir kəsin şərəfinə icrasını: We drink to his health Biz onun sağlığına içirik;* **2.** *Hərəkətin, məsafənin, vaxtın, kəmiyyətin və s. həddini bildirir, Azərbaycan türkcəsinə* **-dək, kimi, qədər** *sözləri ilə tərcümə edilir:* from Saturday **to** Monday şənbə günündən bazar ertəsinə**dək**/ ertəsinə **qədər**; **3.** *Hərəkətin nəticəsini və yaxud vəziyyətin dəyişməsini bildirir:* to bring **to** poverty kasıblığa gətirib çıxarmaq; to fall **to** decay/ruin dağılmaq, uçub xarab olmaq, bərbad olmaq; **4.** *Bir şeyə mənsubluq və ya bir yerə təyin edilməni ifadə edir:* to fasten **to** the wall divar**a** bərkitmək; key **to** the door qapının açarı; *There is an outpatient department attached to our hospital Bizim xəstəxana yanında/nəzdində poliklinika var;* **5.** *Nisbət, müqayisə bildirir: This is nothing to what it might have been Nə baş verə biləcəyi ilə müqayisədə bu heç nədir; 3 is to 4 as 6 is to 8 3-ün 4-ə olan nisbəti 6-nın 8-ə olan nisbəti kimidir; Ten to one he will find out it On haldan doqquzunda o, bundan xəbər tutacaq/biləcək; The score was 1 to 3 id. Hesab 1:3 idi;* **6.** *Müşayiət, uyğunluq bildirir:* to dance **to** music musiqiyə **uyğun** rəqs etmək; *He sang to his guitar O, gitaranın müşayiətilə oxudu;* **7.** *Vaxt bildirir: A quarter to three Saat üçə on dəqiqə qalır;* **8.** *Müxtəlif isimlərlə və fellərlə işlədilir:* to spring **to** *one's* feet yerindən sıçramaq, ayağa qalxmaq; to tear **to** pieces çilik-çilik/parça-parça/ cırıq-cırıq etmək; to come **to** an end sona yetmək, axıra çıxmaq; to sentence **to** death ölümə məhkum etmək; **9.** *Müxtəlif birləşmələrdə işlədilir:* open **to** the public hamıya bəlli; ictimaiyyətə açıq olan; to be of interest **to** all hamı üçün maraqlı olmaq; *It's news to me Bu mənim üçün təzə xəbərdir/ yenilikdir*

**to²** [tu:; tu; tə] *adv* qabağa, irəli; **~ and fro** dala-qabağa; irəli-geri; var-gəl; **close/next ~** yanında; **to push the door ~** qapını örtmək; *I can't get the lid of the trunk quite to Mən sandığın qapağını örtə bilmirəm*

**to³** [tu; tə] *part. Azərbaycan türkcəsində felin məsdər formasının əlaməti olan* **-maq, -mək** *şəkilçilərinə uyğun gəlir:* **to** read **oxumaq**; **to** see **görmək**

**toad** [toud] *n* 1. *zool.* qurı qurbağası; 2. murdar/rəzil adam
**toad-eater** [ˈtoud.i:təʳ] *n* yaltaq, riyakar; ikiüzlü, alçaq
**toadflax** [ˈtoudflæks] *n bot.* yabanı kətan
**toadstool** [ˈtoudstu:l] *n bot.* zəhərli göbələk
**toady**[1] [ˈtoudı] *n* yaltaq; qab dibi yalayan
**toady**[2] [ˈtoudı] *v* yaltaqlıq/ riyakarlıq/ ikiüzlülük/ alçaqlıq etmək
**toadyism** [ˈtoudıızm] *n* 1. yaltaqlıq, riyakarlıq, ikiüzlülük; 2. başqasının hesabına yaşama
**toast**[1] [toust] *n* 1. bir tikə qızardılmış çörək; 2. *d.d.* şərabda qızardılmış çörək; 3. tost, sağlıq, birinin sağlığına təklif; **to drink a ~ to** *smb.* bir kəsin sağlığına içmək; **to give/to propose a ~ to** *smb.* bir kəsin şərəfinə tost demək; 4. şərəfinə tost təklif edilən şəxs/müəssisə/hadisə
**toast**[2] [toust] *v* 1. qızartmaq *(sobada, ocaqda)*; 2. qurudulmaq; qızdırılmaq; **to ~ *one's* feet/toes** ayaqlarını/ayaq barmaqlarını qızdırmaq; 3. sağlığa tost demək/içmək
**toaster** [ˈtoustəʳ] *n* 1. sağlıq/tost deyən; 2. çörək qızartmaq üçün alət
**toast-master** [ˈtoust.ma:stəʳ] *n* tamada, masabəyi, sağlıq deyən, tost söyləyən *(adam)*
**tobacco**[1] [təˈbækou] *n* tütün
**tobacco**[2] [təˈbækou] *adj* tütün; **~ leaves** tütün yarpaqları; **~ grower** tütünçü, tütün becərən; **~ pouch** tənbəki kisəsi; **~ factory** tütün fabriki
**tobacco-box** [təˈbækoubɔks] *n* tütün qutusu, bu-runotu qabı
**tobacconist** [təˈbækənıst] *n* 1. tütün fabriki sahibkarı; 2. tütün məmulatı alverçisi/satıcısı; 3.: **the ~'s** tütün məmulatı dükanı
**tobacco-pipe** [təˈbækoupaıp] *n* çubuq, tənbəki çubuğu, qəlyan
**to-be**[1] [təˈbi:] *n* gələcək
**to-be**[2] [təˈbi:] *adj* gələcək, gələn; **a writer/a painter ~** gələcək yazıçı/rəssam
**toboggan**[1] [təˈbɔgən] *n* 1. kirşə, xizək; 2. xizək /kirşə idmanı
**toboggan**[2] [təˈbɔgən] *v* 1. xizək/kirşə sürmək; 2. kəskin surətdə düşmək; *Prices tobogganed Qiymətlər kəskin surətdə düşdü*
**toboggan-slide** [təˈbɔgənslaıd] *n* xizəklə sürüşmək üçün dağ
**Toby** [ˈtoubı] *n* 1. pivə krujkası/parçı; 2. *teatr.* öyrədilmiş it *(ingilis kukla teatrlarında)*; 3. *amer. d.d.* ucuz və nazik siqar növü
**toby** [ˈtoubı] *n d.d.* dal, arxa
**toccata** [təˈka:ta] *n mus.* tokkata *(dilli musiqi alətləri üçün yazılmış iti çalınan musiqi əsəri)*
**tocology** [təˈkɔlədʒı] *n tib.* mamalıq; mamalıq elmi
**tocsin** [ˈtɔksın] *n* 1. həyəcan/təhlükə siqnalı, haray; 2. haray zəngi, həyəcan təbili
**today**[1] [təˈdeı] *n* bu gün; **~'s game** bu günkü oyun; **~'s lesson** bu günkü dərs
**today**[2] [təˈdeı] *adv* bu gün, bu günkü; *What day is it today? Bu gün hansı gündür?* **from ~** bu gündən belə; *We are making great strides in medicine today Biz səhiyyə sahəsində bu gün iri addımlar atırıq*
**toddle**[1] [ˈtɔdl] *n* 1. axsama, axsaya-axsaya yerimə; 2. *d.d.* gəzinti
**toddle**[2] [ˈtɔdl] *v* 1. axsamaq, axsaya-axsaya / ağır-ağır yerimək, ayaqlarını sürüyə-sürüyə yerimək; *We must toddle d.d. Biz getməliyik*; 2. *d.d.* gəzmək, gəzişmək; 3. addım-addım yerimək *(körpə haq.)*
**toddler** [ˈtɔdləʳ] *n* gəzməyə başlayan körpə, ayaq tutan/açan uşaq
**to-do** [təˈdu:] *n d.d.* qarışıqlıq, çaxnaşma, hay-küy, səs-küy; *What a to-do about nothing? Heç nədən bu nə hay-küydür?*
**toe**[1] [tou] *n* 1. ayaq barmağı *(insanın, heyvanın, quşun)*; **from top to ~** başdan ayağa kimi/qədər; 2. burun *(çəkmədə, corabda)*; 3. aşağı ətraf/ tərəf; 4. dırnağın qabaq tərəfi/ucu
**toe**[2] [tou] *v* 1. toxunmaq, dəymək; ayağı ilə toxunmaq; 2. ayağının ucu/burnu ilə vurmaq; 3. hokkey ağacının ucu ilə vurmaq; **to ~ the line** *id.* start xəttinə düzülmək; 4. *məc.* qaydaya/tələblərə ciddi riayət etmək; 5. toxuyub uzatmaq *(corabın ucunu)*; 6. əyri vurmaq *(mismarı, mıxı və s.)*
**toe-cap** [ˈtoukæp] *n* çəkmənin/ayaqqabının burnu
**toe-nail** [ˈtouneıl] *n* ayaq barmağının dırnağı
**toff** [tɔf] *n* 1. centlmen, tərbiyəli/alicənab adam; **the ~s** "cəmiyyətin qaymağı"; 2. modabaz, moda ilə geyinən adam
**toffee** [ˈtɔfi] *n* iris *(konfet növü)*; **to buy some ~s** bir neçə iris almaq
**tog**[1] [tɔg] *n* 1. *jarq.* palto, üst paltarı; 2. *pl* paltar, geyim; **tennis ~s** tennis geyimi
**tog**[2] [tɔg] *v d.d.* geyindirmək; **to ~ oneself up/out** şıq geyinmək
**toga** [tougə] *n* 1. bürüncək, ehram *(qədim romalıların bədənlərinə sarıdıqları üst geyimi)*; 2. mantiya *(plaş şəklində qolsuz, uzun üst geyimi)*
**together** [təˈgeðə] *adv* 1. bir yerdə, birlikdə, birgə; **to sit ~** birgə/bir yerdə oturmaq; *I couldn't get seats for us together Mən bizim birgə oturmağımız üçün bilet əldə edə bilmədim*; **to tie ~** bir yerə sarımaq/ bağlamaq; **to paste ~** bir yerə yapışdırmaq; **to join ~** bir yerə birləşdirmək; **to cooperate ~** birgə əməkdaşlıq etmək; 2. bir-birinin ardınca, fasiləsiz; **for hours ~** saatlarla fasiləsiz; 3. eyni zamanda, bir vaxtda
**toil**[1] [tɔıl] *n* gərgin əmək/zəhmət
**toil**[2] [tɔıl] *v* 1. **(on, at, through)** gərgin işləmək, zəhmət çəkmək, əmək sərf etmək, çalışmaq; 2. çətinliklə/ yavaş-yavaş yerimək *(həm də **to ~ up/ along**)*; *We toiled up the hill Biz təpəyə çətinliklə çıxdıq*
**toiler** [ˈtɔıləʳ] *n* əməkçi, zəhmətkeş *(adam)*
**toilet**[1] [ˈtɔılıt] *n* 1. tualet, paltar; 2. tualet stolu; 3. vanna otağı; 4. ayaqyolu, tualet; 5. *amer.* geyim otağı
**toilet**[2] [ˈtɔılıt] *adj* tualet; **~ soap** tualet sabunu; **~ water** tualet suyu; **~ articles** tualet ləvazimatı
**toilet-paper** [ˈtɔılıt.peıpəʳ] *n* tualet kağızı
**toiletry** [ˈtɔılıtrı] *n amer.* tualet ləvazimatı
**toilet-set** [ˈtɔılıtset] *n* tualet komplekti/ləvazimatı
**toiletware** [ˈtɔılıtweə] *n* tualet əşyaları *(daraq, şotka və s.)*
**toilful** [ˈtɔılful] *adj* çətin, zəhmətli, ağır
**toilless** [ˈtɔıllıs] *adj* yüngül, zəhmətsiz, asan
**toilsome** [ˈtɔılsəm] *adj* çətin, ağır; yorucu, əziyyətli, üzücü
**Tokay** [touˈkeı] *n* tokay *(şərab növü)*
**token**[1] [ˈtoukn] *n* 1. nişan, nişanə, əlamət; **in ~ of respect** hörmət əlaməti olaraq; *This gift is a token of my love Bu hədiyyə mənim məhəbbətimin əlamətidir*; 2. bəxşiş, hədiyyə, peşkəş, töhfə; 3. jeton *(avtobusda, metroda və s. pul əvəzinə işlədilən metal nişan/marka)*; 4. fərqləndirici nişan;
◊ **by the same ~, by this/by that ~** əlavə olaraq, üstəlik; bundan əlavə
**token**[2] [ˈtoukn] *adj* bənzəyən, oxşar, zahiri; simvolik; **~ smile** zahiri təbəssüm; **~ resistance** zahiri müqavimət; **a ~ payment** simvolik ödəmə
**tolerable** [ˈtɔlərəbl] *adj* 1. dözülən, dözülə bilən, yol verilə bilən; miyanə; **a ~ burden** dözülə bilən ağırlıq/yük; *The pain was severe, but tolerable Ağrı kəskin, lakin dözülə bilən idi*; 2. kafi, kifayətləndirici, qənaətbəxş, təminedici; *The food here is quite tolerable Burada yemək qənaətbəxşdir*
**tolerance** [ˈtɔlərəns] *n* 1. dözmə, dözülə bilmə, yol verilə bilmə; dözüm, səbir; **~ for/of other people's views** başqalarının nöqteyi-nəzərinə dözmə; 2. *mal.* xırda pulun standart ölçü və çəkisindən yol verilə bilən dərəcədə kənara çıxma; 3. *tex.* yol verilə bilən artıqlıq-əskiklik, sapma; 4. *tib.* dözümlülük, saxlama; *My body has built up a tolerance for penicillin, so that it can no longer help me Mənim bədənim penisillinə öyrəşib və daha o mənə kömək edə bilməz*
**tolerant** [ˈtɔlərənt] *adj* 1. dözülə bilən, yol verilə bilən; **to be ~ of criticism** tənqidə dözümlü olmaq, tənqidə dözümlə/səbirlə yanaşmaq; 2. *tib.* dözümlü, saxlayan, mühafizə edən
**tolerate** [ˈtɔləreıt] *v* 1. dözmək, qatlaşmaq, davam gətirmək; *I won't tolerate your impudence Mən sənin/sizin kobudluğuna / kobudluğunuza dözməyəcəyəm*; 2. yol vermək; *I can't tolerate such behaviour Mən belə davranışa yol verə bilmərəm*; 3. *tib.* dözmək, dözümlü olmaq, mühafizə etmək, saxlamaq; *He can't tolerate fat O, yağlı yeməyə dözmür*
**toleration** [.tɔləˈreıʃn] *n* dözmə, dözüm
**toll**[1] [toul] *n* I 1. zəng səsi; 2. kilsə zəngi *(ibadətə başlamazdan əvvəl çalınan)*; dəfn zəngi
**toll** [toul] *n* II 1. rüsum, vergi; **to pay a ~** rüsum vermək; 2. şəhərlərarası danışıq haqqı; 3. dəmir yolu ilə gediş haqqı; 4. rüsum alma/vergi tutma səlahiyyəti; 5. üyütmə haqqı, şahad *(dəyirmançının üyütmə haqqı)*; 6. *hərb.* itki, tələfat; **heavy ~** böyük itki; *The death toll on the roads is heavy Yollarda çoxlu bədbəxt hadisələr baş verir*
**toll**[2] [toul] *adj* pullu, ödənişli; **~ bridge** pullu körpü, keçidi ödənişli körpü; **~ call** şəhərlərarası ödənişli telefon danışığı
**toll**[3] [toul] *v* 1. çalmaq *(zəng)*; **to ~ a bell** zəngi çalmaq; *The bell tolled Zəng çalındı*; 2. kilsə zəngini çalmaq; dəfn/matəm zəngi çalmaq
**tollable** [ˈtouləbl] *adj* vergi/rüsum qoyulan, vergi/ rüsum alınan, vergiyə cəlb edilən
**toll-bar** [ˈtoulba:ʳ] *n* keçidi rüsumla olan alaqapı/ şlaqbaum
**toller** [ˈtouləʳ] *n* 1. zəngçi, zəng çalan *(kilsədə)*; 2. zəng
**toll-gate** [ˈtoulgeıt] *n* = **toll-bar**
**tollhouse** [ˈtoulhaus] *n* zastavada/alaqapıda yol rüsumu yığan post/məntəqə
**toll line** [ˈtoullaın] *n* 1. şəhərətrafı telefon xətti; 2. *amer.* şəhərlərarası telefon xətti
**tollman** [ˈtoulmən] *n (pl* **-men** [-mən]) rüsum toplayan/ vergi yığan *(qulluqçu)*
**Tom** [tɔm] *n* 1. adi /sadə adam; 2. böyük zəngin və ya topun adı; **Long Tom** Uzun Tom; 3. erkək *(heyvan və quşlarda)*; **~ cat** erkək pişik; **~ turkey** hind xoruzu, loş; **every ~, Dick and Harry** hər yetən, hər yoldan ötən; hər rast gələn *(adam)*
**tomato**[1] [təˈma:tou] *n* pomidor
**tomato**[2] [təˈma:tou] *adj* pomidor; **~ juice/sauce** pomidor şirəsi/sousu
**tomb** [tu:m] *n* 1. qəbir, məzar, gor; türbə; **Tomb of the Unknown Soldier** Naməlum Əsgərin məzarı; 2. məqbərə, sərdabə, türbə
**tomboy** [ˈtɔmbɔı] *n* dəcəl, nadinc, şuluqçu *(qız)*; *She's a tomboy O, dəcəl qızdır*
**tombstone** [ˈtu:mstoun] *n* qəbirdaşı, başdaşı
**tom-cat** [ˈtɔmˈkæt] *n* erkək pişik
**tome** [toum] *n* cild, böyük kitab
**tomfool**[1] [ˈtɔmˈfu:l] *n* 1. səfeh, axmaq, gic, sarsaq; 2. oyunbaz, təlxək
**tomfool**[2] [ˈtɔmˈfu:l] *v* gic-gic zarafat etmək, şitlik etmək
**tomfoolery** [tɔmˈfu:lərı] *n* səfehlik, axmaqlıq, sarsaqlıq, giclik
**tommy** [ˈtɔmı] *n* 1. ingilis əsgəri/sıravisi; 2. *tar.* fəhlələrə verilən ərzaq *(pul əvəzinə)*; 3. *d.d.* çörək; **brown ~** qara çörək
**tommy-bar** [ˈtɔmıba:ʳ] *n tex.* ling
**tommy-gun** [ˈtɔmıgʌn] *n hərb.* avtomat
**tomnoddy** [ˈtɔm.nɔdı] *n* sadədil, safdil, sadəlövh; səfeh, axmaq
**tomorrow**[1] [təˈmɔrou] *n* sabah, sabahkı gün; gələcək; **till ~** sabaha kimi/qədər; **the day after ~** biri gün, bir gün sonra; *Tomorrow is with us*

*Gələcək bizimlədir /bizimdir;*
◊ *Tomorrow is a new day ≅ Axşamın xeyrindən sabahın şəri yaxşıdır*
**tomorrow²** [tə'mɔrou] *adj* sabahkı; **~'s date** sabahkı tarix; **~ evening** sabah axşam; **~ morning** sabah səhər
**tomorrow³** [tə'mɔrou] *adv* sabah; *We'll go tomorrow Biz sabah gedəcəyik; The meeting is scheduled for tomorrow İclas sabaha təyin edilib;*
**tomtit** ['tɔm'tıt] *n zool.* arıquşu
**ton** [tʌn] *n* ton *(min kiloqram)*; **long** ~ uzun ton (1016 kq); **metric** ~ metrik ton (1000 kq); **short/net** ~ qısa ton (907,2 kq); **register** ~ *dən.* registr tonu *(nəqliyyat gəmilərinin daxili həcmini ölçmək üçün 2,83 m³-ə bərabər olan şərti vahid)*
**tonality** [tou'næliti] *n mus.* tonallıq *(musiqi əsərinin əsasını təşkil edən hər bir qamma)*
**tone¹** [toun] *n* **1.** ton, avaz, intonasiya; *His tone was serious Onun səsinin tonu ciddi idi;* **2.** *mus.* ton, səs; *This violin has a beautiful tone Bu skripkanın gözəl səsi/ tonu var;* **3.** ton, ifadə; səciyyə, üslub; **to set the** ~ ton əlavə etmək, ton vermək; **4.** ümumi şərait/ mühit; **5.** hal, əhval, əhvali-ruhiyyə; *Her answer had a friendly tone Onun cavabında bir dostluq əhval-ruhiyyəsi vardı;* **6.** intonasiya, modulyasiya *(səsdə)*; **7.** musiqi vurğusu; **8.** *tib.* tonus *(orqanizmin və yaxud onun ayrı-ayrı hissələrinin həyat fəaliyyəti dərəcəsi)*; **to give** ~ qüvvət/güc vermək; **muscle** ~ əzələ tonusu; *Exercise will improve the tone of your muscles İdman sənin/sizin əzələlərinin/ əzələlərinizin tonusunu yaxşılaşdıracaq;* **9.** üslub, zəriflik; *Their many paintings gave the house a cultured tone Onların çoxlu rəsmləri evə bir kübar görkəm verdi*
**tone²** [toun] *v* **1.** arzu olunan ton vermək *(səsə və ya boyaya)*; dəyişdirmək *(tonu, rəngi)*; **2.** kökləmək, sazlamaq *(musiqi alətini)*; **3. (in, with)** həmahəng/ uyğun olmaq, uyğun gəlmək; **4. (down)** yumşaltmaq *(ifadəni)*, yüngülləşdirmək *(boyanı)*; **5. (up)** gücləndirmək, qüvvətləndirmək
**tone-arm** ['toun'a:m] *n* valçaldıranın adapteri *(plastinkaları radio aparatı ilə birləşdirən cihaz)*
**toneless** ['tounlıs] *adj* ifadəsiz, ifadə cəhətdən zəif
**tongs** [tɔŋz] *n pl (adət.* **a pair of** ~) kəlbətin; maşa; **sugar** ~ qənddoğrayan; **coal/fire** ~ soba maşası;
◊ *I wouldn't touch him with a pair of tongs Mənim onunla heç bir işim yoxdur, Mən onunla heç bir iş görmək istəmirəm*
**tongue** [tʌŋ] *n* **1.** dil; **the ancient ~s** qədim dillər; **to put out *one's*** ~ dilini göstərmək *(həkimə və ya ədəbsizlikdən)*; *His tongue failed Onun dili tutuldu;* **to find *one's*** ~ dili açılmaq; **to hold *one's*** ~ dilini saxlamaq; *His tongue is too long for his teeth Onun dili çox uzundur; (yəni paltak danışır)* **to oil *one's*** ~ yaltaqlıq etmək; **the mother** ~ ana dili; **2.** nitq, danışıq tərzi; **a glib** ~ alovlu/qızğın nitq; **3.** dil *(yemək kimi)*; **smoked** ~ hisdə qurudulmuş/hisə verilmiş dil; **4.** dil *(alovun və s.)*; **~s of flame** alovun dilləri; **~ of the shoe** ayaqqabının dili; **5.** *coğ.* dil; **6.** tərəzinin əqrəbi/mili; **7.** *tex.* mil, uc, çıxıntı, diş; **8.** dişlə, çillə *(qoşqu aləti)*
**tongue-tied** ['tʌŋtaıd] *adj* **1.** pəltək, diliağır; dilişirin; **2.** nitqi tutulan *(utancaqlıqdan və s.)*
**tongue-twister** ['tʌŋ,twıstəʳ] *n* yanıltmac, iti /tez-tez danışma
**tonic** ['tɔnık] *n* **1.** *tib.* fəaliyyətə gətirən vasitə, həyat tonusunu qaldıran dərman; *Swimming has a tonic effect Üzmənin tonusverici təsiri vardır;* **2.** *mus.* tonika *(qammanın birinci tonu üzərində düzəldilən üç səs)*
**tonight¹** [tə'naıt] *n* bu gün axşam; bu gün gecə
**tonight²** [tə'naıt] *adv* bu gün axşam; *He'll come tonight O bu axşam gələcək*
**tonnage** ['tʌnıdʒ] *n* **1.** tonnaj *(üzən gəminin sıxışdırıb çıxartdığı suyun tonla çəkisi)*; **2.** tonnaj *(gəminin, avtomobilin, vaqonun və s. daşıya biləcəyi yük)*; **3.** tonnaj *(müəyyən bir dəniz donanmasının ton hesabı ilə tutumunun ümumi ağırlığı)*
**tonometer** [tou'nɔmıtəʳ] *n* **1.** *mus.* kamerton *(çalğı alətlərini köklənmək üçün səsindən istifadə edilən kiçik polad alət)*; **2.** tonometr *(iki kamerton rəqslərinin sayını tutuşdurmaq üçün cihaz)*
**tonsil** ['tɔnsl] *n anat.* badamcıq vəzisi
**tonsillitis** [,tɔnsı'laıtıs] *n tib.* tonzilit, badamcıq vəzilərinin iltihabı
**tony** ['tounı] *adj amer. d.d.* gözəl, zərif, incə, nəfis, şıq, qəşəng
**too** [tu:] *adv* **1.** həmçinin, həm də, eyni zamanda, eləcə də, da, də; *I lived in France and in Italy too Mən Fransada, eləcə də İtaliyada yaşadım; Tell your husband too Ərinə/Ərinizə də de/deyin;* **2.** bundan başqa, savayı; həm də; *Our products are just as good and cheaper too Bizim mallarımız yaxşıdır, həm də xeyli ucuzdur;* **3.** çox, həddən artıq/ziyadə; **~ fast** həddən artıq sürətlə; *The box is too heavy for me to carry Bu qutunu daşımaq mənim üçün çox ağırdır; You are too kind Sən/Siz çox iltifatlısan/ iltifatlısınız; This coat is too big for me Bu palto mənə çox böyükdür; That's too bad O çox pisdir*
**tool¹** [tu:l] *n* **1.** alət; **carpenter's ~s** dülgər alətləri; **farm ~s** kənd təsərrüfatı alətləri; **2.** vasitə, alət; *Books are tools of education Kitablar təhsil vasitələridir; He is just their tool O sadəcə olaraq onların əlində bir alətdir;* **3.** dəzgah; **a machine** ~ dəzgah;
◊ **to sharpen *one's* ~s** hazırlaşmaq, hazırlanmaq; **to play with edged ~s** odla oynamaq; *A bad master quarrels with his tools Pis ustanın həmişə aləti günahkar olur*
**tool²** [tu:l] *v* **1.** alətlə iş görmək/fəaliyyət göstərmək; **2.** yonmaq *(daşı)*; **3.** düzəltmək *(tiyə ilə)*, hazır şəklə salmaq; **4.** şəkil basmaq, naxış salmaq, bəzək vurmaq *(dəriyə, cildə və s.)*; **to ~ leather** dəriyə bəzək vurmaq; **5.** getmək, gəlmək *(minikdə, ekipajla)*; *We tooled along the highway in our new car Biz təzə maşınımızla şose yolu ilə getdik;* **6.** təchiz etmək *(avadanlıqla, dəzgahla, alətlə)*; **to ~ up a factory** fabriki avadanlıqla təchiz etmək
**toolbox** ['tu:lbɔks] *n* alət qutusu
**toolkit** ['tu:lkıt] *n* alət dəsti
**toolmaker** ['tu:lmeıkəʳ] *n* alətlər hazırlayan mütəxəssis/fəhlə
**toolroom** ['tu:lrum] *n* alət sexi
**toot¹** [tu:t] *n* **1.** fışqırıq, fit səsi; uğultu; **2.** *amer.* kef, eyş-işrət
**toot²** [tu:t] *v* fit vermək; uğuldamaq; şeypur çalmaq
**tooth** [tu:θ] *n (pl* **teeth)** **1.** diş; **root of the** ~ dişin kökü; **false teeth** süni/qoyulma dişlər; **to pull a ~ out** diş çəkmək/çıxartdırmaq; *I had my tooth out Mən dişimi çəkdirdim/çıxartdırdım; His teeth are chattering from the cold Onun dişləri soyuqdan bir-birinə dəyir;* **to grit/to clench *one's* teeth** dişlərini qıcırtmaq/sıxmaq; **2.** *tex.* diş *(mişarda, daraqda, çarxda və s.)*;
◊ **~ and nail** hər vasitə ilə, dişlə-dırnaqla; **in the teeth of** əksinə/ziddinə/xilafına olaraq; **in the teeth of the wind** küləyin əksinə, küləyə qarşı; **armed to the teeth** təpədən-dırnağa qədər silahlanmış
**toothache** ['tu:θeık] *n* diş ağrısı
**tooth-brush** ['tu:θbrʌʃ] *n* diş fırçası/şotkası
**toothing** ['tu:θıŋ] *n tex.* dişli qarmaq/çəngəl
**toothless** ['tu:θlıs] *adj* dişsiz, dişi olmayan
**tooth-paste** ['tu:θpeıst] *n* diş pastası/məcunu
**toothpick** ['tu:θpık] *n* diş təmizləyən/qurdalayan
**tooth-powder** ['tu:θ,paudəʳ] *n* diş tozu
**toothsome** ['tu:θsəm] *adj* dadlı, ləzzətli, dadı yaxşı, tamlı
**tootle¹** ['tu:tl] *n* şeypur/fleyta səsi
**tootle²** ['tu:tl] *v* astadan boru /fleyta çalmaq
**top¹** [tɔp] *n* **1.** yuxarı, təpə; zirvə *(dağın və s.)*; **the ~ of the mountain** dağın təpəsi/zirvəsi; **2.** *amer.* üst, üz, yuxarı; qapaq *(qazanda)*; **~ of milk** südün üzü/ qaymağı; **from ~ to toe** başdan-ayağa; **from ~ to bottom** yuxarıdan aşağıyadək; **3.** kənar, qıraq *(kitabda, kartonda və s.)*; **4.** kökümeyvəli bitkilərin gövdə və yarpaqları, tac; **5.** şpil *(binanın təpəsində uzun mil)*; **6.** yüksək kürsü, birinci yer; **to come out on** ~ yarışda qalib gəlmək/birinci yerə çıxmaq; **to come/to rise to the** ~ üzə/ortaya/aşkara çıxmaq; **to take the ~ of the table** stolun başında oturmaq; **7.** yuxarı pillə, ali dərəcə; **at the ~ of *one's* voice** var səsi ilə, bərkdən; *He has reached the top of his profession O, peşə ustalığının ən yüksək pilləsinə/ zirvəsinə çatıb;* **8.** domna peçinin ağzı; **9.** fırfıra, fırlanğıc; **10.** *dən.* mars *(gəmi dorunda müşahidəçi üçün meydança)*;
◊ **to go over the** ~ *harb.* hücuma keçmək; qəti addım atmaq; **on ~ of everything else** bütün bunların başında; **to be/to sit on ~ of the world** göyün yeddinci qatında olmaq
**top²** [tɔp] *adj* **1.** yuxarı; **the ~ shelf/drawer** yuxarı rəf/siyirmə; **~ storey** yuxarı mərtəbə; **in the ~ left-hand corner** yuxarıdan sol küncdə; **2.** ən yüksək/yaxşı, əla; **~ grade** əla növ; **our ~ footballers** bizim ən yaxşı futbolçularımız; *He got top mark in physics O, fizikadan əla qiymət aldı;* **3.** *məc.* yuxarı təbəqə; **the ~ men** yuxarı təbəqəli adamlar
**top³** [tɔp] *v* **(-pp-)** **1.** ucunu kəsmək/vurmaq, ayırmaq; **to ~ turnips** şalğamı kökündən kəsmək; **to ~ and tail gooseberries** qarağat kollarını kəsmək; **2.** yuxarıda olmaq, başçılıq etmək; *Our team topped the league Bizim komanda turnir cədvəlinə başçılıq edirdi;* **3.** örtmək, bürümək; *The mountain was topped with snow Dağın başı/zirvəsi qarla örtülmüşdü;* **4.** başa çatdırmaq, qurtarmaq, tamamlamaq *(müvəffəqiyyətlə)*; **to ~ *one's* part** öz rolunu əla oynamaq; **5.** ötmək, keçmək, ötüb keçmək; *He tops his father by a head O, atasından bir baş hündürdür;* **6. (off)** başa çatmaq/çatdırmaq, sona yetmək; *They topped off their drink with fruit Onlar naharlarını meyvə ilə sona çatdırdılar;* **7. (up)** doldurmaq, əlavə etmək; *Let me top up your glass Qoy/Qoyun sənin /sizin fincanını/fincanınızı doldurum; We topped up with petrol Biz benzin doldurduq*
**top-boot** ['tɔp'bu:t] *n* hündür çəkmə
**topcoat** ['tɔp'kout] *n* palto
**top-dress** ['tɔp'dres] *v k.t.* əlavə gübrə vermək, əlavə gübrələmək *(bitkini)*
**tope** [toup] *v* sərxoşluq/əyyaşlıq etmək
**toper** ['toupəʳ] *n* əyyaş, içki düşkünü
**topflight** ['tɔpflaıt] *adj d.d.* ən yaxşı, əla, mükəmməl, çox yaxşı
**topfull** ['tɔpful] *adj* ağzınacan dolu, dopdolu
**top hat** ['tɔp'hæt] *n d.d.* silindr, şlyapa
**top-heavy** ['tɔp'hevı] *adj* möhkəm olmayan, dayanıqsız, düşə /dağıla bilən; *That pile of books is top-heavy; it will fall O kitab topası möhkəm dayanmayıb; uçub dağılacaq*
**top-hole** ['tɔp'houl] *adj d.d.* ən mükəmməl/yaxşı, əla, çox yaxşı
**topic** ['tɔpık] *n* mövzu, obyekt; **the ~ of the day** günün mühüm/aktual mövzusu
**topical** ['tɔpıkəl] *adj* **1.** aktual, ən vacib/mühüm; **a ~ question** mühüm məsələ; **2.** tematik; **3.** *tib.* yerli
**topicality** [,tɔpı'kælıtı] *n* aktuallıq, mühümlük, əhəmiyyətlilik
**topknot** ['tɔpnɔt] *n* **1.** bir çəngə tük/lələk *(qadınların saç qoyma forması)*; **2.** kəkil *(quşlarda)*
**toplevel** ['tɔp'levl] *adj* yüksək səviyyəli; **~ negotiations** yüksək səviyyəli danışıqlar
**top liner** ['tɔp,laınəʳ] *n* məşhur aktyor, "ulduz"
**topmost** ['tɔpmoust] *adj* **1.** ən/lap yüksək, ən/lap yuxarı; **2.** ən mühüm/vacib

**top-notch** ['tɔp'nɔtʃ] *adj d.d.* çox gözəl/yaxşı, əla, birinci dərəcəli
**topographer** [tə'pɔgrəfə^r] *n* topoqraf
**topography** [tə'pɔgrəfı] *n* topoqrafiya
**topology** [tə'pɔlədʒı] *n riyaz.* topologiya *(həndəsənin cisimlərin xassələrindən bəhs edən hissəsi)*
**toponymy** [tə'pɔnımı] *n* toponimiya
**topper** ['tɔpə^r] *n d.d.* **1.** şlyapa, silindr; **2.** səbə-tin/qutunun üstündəki *(adət. meyvə haq.)*; **3.** ən yaxşı adam
**topping** ['tɔpıŋ] *adj* **1.** yuxarı qalxan; **2.** başçılıq edən, başda duran; **3.** *d.d.* çox gözəl/yaxşı, əla; **4.** *amer.* təşəxxüslü, təkəbbürlü, iddialı
**toppingly** ['tɔpıŋlı] *adv d.d.* çox gözəl/yaxşı, əla
**topple** ['tɔpl] *v* **1.** yerə tökmək/tökülmək; yıxılmaq, uçmaq; *The tall pile of books toppled over Hündür kitab yığını uçub töküldü*; **2.** yıxılmaq, düşmək; **to ~ over a cliff** qayadan yıxılmaq; **to ~ into the water** suya yıxılmaq/düşmək; **3.** çevrilmək, arxası üstə düşmək *(həm də* **to ~ over/down***)*; **4.** devirmək, süquta yetirmək; *The government was toppled by a revolution İnqilab hökuməti devirdi*
**top-ranking** ['tɔpræŋkıŋ] *adj* yüksəkvəzifəli, yüksək mövqe tutan; **a ~ person** yüksək vəzifəli şəxs
**top-secret** ['tɔp'si:krıt] *adj* tam məxfi; **~ papers** tam məxfi sənədlər
**top sergeant** ['tɔp'sɑ:dʒənt] *n amer. hərb.* rota starşinası
**top-soil** ['tɔpsɔıl] *n k.t.* torpağın əkinə yararlı üst qatı
**topsy-turvy** ['tɔpsı'tə:vı] *adv* tərsinə, baş-ayaq, alt-üst
**toque** [touk] *n fr* **1.** qadın şlyapası; **2.** *zool.* makaka *(itaoxşar kiçik meymun cinsi)*
**tor** [tɔ:^r] *n* təpənin qayalıq zirvəsi
**torch**[1] [tɔ:tʃ] *n* **1.** məşəl, fənər; **an electric/a pocket ~** elektrik/cib fənəri; **2.** *məc.* işıq, həqiqət; **the ~ of science** elm işığı; **3.** *tex.* lehimləmə lampası; odluq
**torch**[2] [tɔ:tʃ] *v* məşəllə işıqlandırmaq
**torchère** [tɔ:'ʃeə^r] *n fr.* torşer
**torch-fishing** ['tɔ:tʃ,fıʃıŋ] *n* işıq vasitəsilə balıq tutma/ovlama
**torchlight** ['tɔ:tʃlaıt] *n* məşəl işığı; elektrik fənəri
**torch-singer** ['tɔ:tʃ,sıŋə^r] *n* müğənni *(uğursuz məhəbbət haqqında sentimental mahnı oxuyan)*
**torch-song** ['tɔ:tʃsɔŋ] *n* mahnı *(uğursuz məhəbbət haqqında sentimental mahnı)*
**toreador** ['tɔrıədɔ:] *n* toreador *(İspaniyada öküz döyüşündə: öküzə qılıncla son zərbəni vurub öldürən pəhləvan)*
**toreutic** [tə'ru:tık] *adj* oyma, kəsmə; kəsilmiş, zərb olunmuş *(pul, medal haq.)*
**torment**[1] ['tɔ:mənt] *n* **1.** əziyyət, əzab, işgəncə, məşəqqət; **to suffer ~s** əziyyət/məşəqqət/əzab çəkmək; **2.** əziyyət/məşəqqət/əzab mənbəyi, işgəncə ocağı
**torment**[2] ['tɔ:mənt] *v* **1.** əziyyət/işgəncə vermək, zülm etmək; **to ~ an animal** heyvana əziyyət/işgəncə vermək; **2.** təngə/cana gətirmək, bezdirmək; iztirab vermək; üzmək, incitmək; **to be ~ed by doubts/toothache** şübhələrdən/diş ağrısından əziyyət çəkmək; *We were tormented by the mosquitoes Ağcaqanadlar bizi təngə gətirdi*; **to ~ smb. with questions** bir kəsi suallarla zara gətirmək
**tormentor** [tɔ:'mentə^r] *n* **1.** əzab/məşəqqət /əziyyət verən, zülmkar, zalım; **2.** təkərli mala, dırmıq
**tormentress** [tɔ:'mentrıs] *n* əzab/əziyyət verən qadın, zülmkar/zalım qadın
**tormina** ['tɔ:mınə] *n pl tib.* bağırsaqlarda ağrılar/sancılar
**torn**[1] [tɔ:n] *adj* **1.** cırılmış, yırtılmış, cırıq-cırıq, yırtıq; *Your trousers are torn in the back Sənin/Sizin şalvarın/şalvarınız arxadan cırılıb*; **2.** *tib.* qırılmış; **~ muscle** qırılmış əzələ
**torn**[2] [tɔ:n] **to tear** *felinin pp forması*
**tornado** [tɔ:'neıdou] *n (pl* **-oes***)* tufan, qasırğa, burağan *(tropik ölkələrdə)*
**torpedo**[1] [tɔ:'pi:dou] *n* **1.** *(pl* **-oes***)* torpedo *(özünə hərəkət edən sualtı mina)*; **2.** *amer. sl.* peşəkar cani/qatil; **3.** skat *(sivri quyruqlu, yastı bədənli iri yırtıcı balıq)*; **4.** *d.y.* siqnal fişəngi
**torpedo**[2] [tɔ:'pi:dou] *v* **1.** torpedo ilə partlatmaq/dağıtmaq/vurmaq; **2.** *məc.* məhv etmək, yerlə-yeksan etmək; **to ~ a project** layihəni məhv etmək
**torpedo-boat** [tɔ:'pi:doubout] *n* torpedo kateri
**torpedo-net(ting)** [tɔ:'pi:dou,net(ıŋ)] *n* mina əleyhinə şəbəkə
**torpedo-plane** [tɔ:'pi:douplein] *n* torpedotan təyyarə
**torpid** ['tɔ:pıd] *adj* **1.** keyləşmiş, keyimiş; **2.** fəaliyyətsiz, ölgün, zəif, süst; **3.** *zool.* yuxulu, yuxu halında; *A hibernating animal is torpid Qışlayan heyvan yuxulu olur*
**torpidity** [tɔ:'pıdıtı] *n* keylik, fəaliyyətsizlik, süstlük, zəiflik
**torpids** ['tɔ:pıdz] *n pl* avarçəkmə yarışları *(Oksford universitetində milad bayramı tətilindən sonra)*
**torpor** ['tɔ:pə^r] *n* **1.** keylik, fəaliyyətsizlik, süstlük, zəiflik; **2.** laqeydlik, ölgünlük, soyuqluq, həvəssizlik; **3.** kütlük; korazehinlik
**torque** [tɔ:k] *n* **1.** *arxeol.* burulmuş metal boyunbağı; **2.** *fiz.* fırlanma anı
**torrent** ['tɔrənt] *n* **1.** *məc. pl* axın, sel; *The rain came in torrents Leysan yağırdı, Güclü yağış yağırdı*; **2.** *məc.* axın, sel; **a ~ of abuse** təhqir/söyüş seli
**torrential** [tə'renʃl] *adj* **1.** iti axan; **2.** çox güclü, şiddətli; **3.** çoxlu, zəngin, dolu, bol
**Torricellian** [,tɔrı'tʃelıən] *adj* Torriçelli; **~ vacuum** Torriçelli boşluğu
**torrid** ['tɔrıd] *adj* tropik, isti, hərarətli, odlu, qızğın, qızmar; **a ~ zone** tropik/isti qurşaq
**torse** [tɔ:s] *n* hörük, çiçək hörüyü, zəncirə



**torsion** ['tɔ:ʃn] *n* **1.** *tex.* eşmə, burma; **2.** eşilmə, burulma; əyirmə, əyrilmə
**torso** ['tɔ:sou] *n* **1.** bədən, gövdə *(insanda)*; **2.** gövdə *(heykəldə)*
**tort** [tɔ:t] *n hüq.* qanun pozuntusu/pozma
**torticollis** [,tɔ:tı'kɔlıs] *n tib.* əyriboyun
**tortile** ['tɔ:tıl] *adj* eşilmiş, burulmuş, əyrilmiş
**tortoise** ['tɔ:təs] *n* **1.** *zool.* tısbağa, (çanaqlı) bağa; **2.** ağırtərpənən/ləng adam, astagəl; ◊ **to set the ~ to catch the hare** tısbağanı dovşan tutmağa göndərmək; mümkün olmayan şeyə cəhd etmək; ≅ araba ilə dovşan tutmaq; *The tortoise wins the race while the hare is sleeping Dovşan yatanda, tısbağa qaçışda/yarışda qalib gələr*
**tortoiseshell** ['tɔ:təsʃel, 'tɔ:təʃel] *n* tısbağa/bağa qını
**tortuosity** [,tɔ:tju'ɔsıtı] *n* **1.** əyrilik, əyri-üyrülük; **2.** qeyri-müəyyənlik, qeyri-səmimilik; ikimənalılıq; **3.** əxlaqsızlıq; **4.** *k.t.* eşilmiş/burulmuş yun
**tortuous** ['tɔ:tjuəs] *adj* **1.** əyri, əyri-üyrü; **a ~ path** əyri-üyrü cığır; **~ stream** əyri-üyrü axın; **2.** qeyri-müəyyən, qeyri-səmimi; riyakar; **a ~ argument** riyakar dəlil/sübut; **a ~ policy** qeyri-müəyyən siyasət; **3.** əxlaqsız, şərəfsiz; **a ~ politician** şərəfsiz siyasətçi
**torture**[1] ['tɔ:tʃə^r] *n* **1.** əzab, əziyyət, işgəncə; **instrument of ~** işgəncə aləti; **to put** ***smb.*** **to the ~** bir kəsə işgəncə/əzab vermək; **the ~s of ancient times** qədim zamanların işgəncələri; **2.** məşəqqət; can verme; **to suffer ~** əziyyət/əzab çəkmək; üzülmək; **the ~s of the damned** cəhənnəm əzabları; **3.** əzab mənbəyi
**torture**[2] ['tɔ:tʃə^r] *v* **1.** əzab/əziyyət/işgəncə vermək; **to ~ a prisoner** məhbusa işgəncə vermək; **2.** incitmək, zülm etmək; üzmək; *Don't torture me by keeping me in suspense Məni qeyri-müəyyənliklə üzmə/ üzməyin*; **3.** təhrif etmək, pozmaq, korlamaq, mənasını dəyişdirmək; **to ~ words to make them fit** ***one's*** **arguments** dəlillərini təsdiq etməkdən ötrü sözlərin mənalarını təhrif etmək; **4.** işgəncə verməklə almaq *(məlumat, sirr və s.)*; söz almaq, sirr öyrənmək
**torturer** ['tɔ:tʃərə^r] *n* əzab/əziyyət/zülm verən, zülmkar, zalım; cəllad
**torturous** ['tɔ:tʃərəs] *adj* əziyyətli, əzablı, üzücü; məşəqqətli
**Tory** ['tɔrı] *n* **1.** Tori *(İngiltərədə indiki konservatorlar partiyasının əsasını təşkil edən siyasi partiyanın adı)*; konservatorlar partiyası; **2.** konservatorlar partiyasının üzvü
**toss**[1] [tɔs] *n* **1.** atma, tullama; atılma, tullanma; **a ~ of a ball** top atma; **the ~ of a coin** puşk atma; **2.** qaldırma; **to give a knowing ~ of the head** anlama əlaməti olaraq başını yırğalamaq; **3.** sarsıntı, sarsıtma, titrəmə, titrədilmə, əsdirmə, əsmə; **4.** yıxılma *(atdan)*; **5.** *d.d.* qarışıqlıq, həyəcan, hay-küy, çaxnaşma; ◊ **to take a ~** yıxılmaq, düşmək; **to win/to lose the ~** püşkü udmaq/uduzmaq
**toss**[2] [tɔs] *v* **1.** atmaq, tullamaq; **to ~ a ball** topu atmaq; **to ~ a bone to a dog** itə sümük tullamaq; **to ~** ***one's*** **hat on the table** şlyapasını stolun üstünə atmaq; **2.** salmaq *(atlını, süvarini)*, yıxmaq, atmaq, tullamaq; *The horse tossed its ruler At sahibini yıxdı/belindən saldı*; **3.** qaldırmaq, atmaq; yelləmək; *She tossed her head back O, başını yellədi*; **4.** yuxarı/göyə/dik atmaq; **to ~ a pancake** tavanı dik atmaqla blini çevirmək; **5.** fırlatmaq, atıb-tutmaq, o tərəf bu tərəfə tullamaq; **6.** *məc.* həyatı müxtəlif vəziyyətlərə/keşməkeşlərə salmaq; **7.** çapalamaq, çırpınmaq, vurnuxmaq *(yuxuda və s.)*; **to ~ about on the bed in pain** ağrıdan yataqda çapalamaq; **8.** qalxıb-enmək; dalğalarla əlləşmək; **to be ~ing for days on the ocean** günlərlə okeanda dalğalarla əlləşmək; **9.** yavaş-yavaş dalğalanmaq, yellənmək *(bayraq)*; **10.** *geol.* yumaq, yuyub təmizləmək *(filizi)*
**tosspot** ['tɔspɔt] *n* əyyaş, içki düşkünü; ≅ çaxır tuluğu
**toss-up** ['tɔs'ʌp] *n* **1.** püşk/çöp atma; **to have a ~** püşk atmaq; **2.** bərabər imkan; **3.** qeyri-müəyyənlik; aydın/ məlum olmama; *It's a toss-up whether he will get here in time Onun vaxtında gəlib-gəlməməsi hələ məlum deyil*
**tossy** ['tɔsı] *adj d.d.* təşəxxüslü, təkəbbürlü, iddialı, heç kəsi bəyənməyən
**tosticate** ['tɔstıkeıt] *v* **1.** *dial.* o tərəf bu tərəfə atmaq, diyirlətmək; **2.** ayırmaq, yayındırmaq, sındırmaq
**tot**[1] [tɔt] *n d.d.* **1.** balaca uşaq/oğlan; **a tiny ~** körpə bala; **2.** balaca qədəh *(şərab üçün)*; **3.** balaca qurtum, udum, içim *(şərab)*; **4.** bir damcı, bir az/tikə
**tot**[2] [tɔt] *v d.d.* cəmləmək, yekun vurmaq; yekunlaşdırmaq
**total**[1] ['toutl] *n* tam, bütöv; cəm; məbləğ, yekun, məcmu; **the grand ~** ümumi məcmu; *Will you figure out the total for me? Zəhmət olmasa, ümumi yekunu vur/vurun*
**total**[2] ['toutl] *adj* **1.** ümumi, bütün; cəmi; **the ~ amount/cost** ümumi məbləğ/dəyər; **the ~ number of...** ...ümumi sayı/miqdarı; **~ population** əhalinin ümumi sayı; *The total is four million Cəmi dörd milyondur*; **2.** tam, tamam; **~ victory** tam qələbə; **~ eclipse** tam tutulma *(günəş, ay)*; **in ~ darkness** tam qaranlıqda; **in ~ isolation** tam ayrılıqda, tamam təklikdə; **~ failure** tam iflas/ müvəffəqiyyətsizlik; **3.** ümumi; **~ war** ümumi müharibə
**total**[3] ['toutl] *v* **(-ll-) 1.** cəmləmək, yekun vurmaq, yekunlaşdırmaq; hesablamaq; **2.** ibarət olmaq; təşkil etmək; *Military assistance totals 100 million dollars Hərbi kömək 100 milyon dollardan*

*ibarətdir;* 3. saymaq, hesablamaq, sayıb miqdarını müəyyən etmək/bilmək

**totalitarian** [ˌtoutælɪˈteərɪən] *adj* totalitar; ümumi

**totality** [touˈtælɪtɪ] *n* cəmlik, cəm, yekun, məcmu; **in ~** bütünlükdə, hamısı birlikdə

**totalizator, -isator** [ˈtoutəlaɪzeɪtəʳ] *n* totalizator *(cıdırda: hər at üçün qoyulan mərc pulunu göstərən sayğac)*

**totalize, -ise** [ˈtoutəlaɪz] *v* **1.** bir yerə toplamaq, birləşdirmək; **2.** yekun vurmaq, yekunlaşdırmaq

**totalizer, -iser** [ˈtoutəlaɪzəʳ] *n* toplayıcı maşın, yekunlaşdırıcı mexanizm

**tote**[1] [tout] *n d.d.* **1.** yük; **2.** daşıma, daşınma

**tote**[2] [tout] *v d.d.* gəzdirmək, daşımaq, aparmaq; gətirmək *(miniklə)*; **to ~ a gun** silah gəzdirmək; **to ~ a load** yük daşımaq

**totem** [ˈtoutəm] *n* totem (1) *bəzi ibtidai xalqların sitayiş etdikləri heyvan, bitki və s.*; 2) *bu cür heyvanın və ya başqa şeyin surəti)*

**totter** [ˈtɔtəʳ] *v* **1.** ağır-ağır /ayaqlarını sürüyə-sürüyə yerimək; axsamaq; *He tottered towards us O, ayaqlarını sürüyə-sürüyə bizə tərəf gəldi;* **2.** yırğalanmaq, titrəmək, əsmək; laxlamaq, səndələmək; 3. məhv /tələf/həlak/puç olmaq; dağılmaq, viran olmaq

**tottering** [ˈtɔtərɪŋ] *adj* qətiyyətsiz, səbatsız, zəif; **~ steps** zəif/qətiyyətsiz addımlar; **~ gait** qətiyyətsiz yeriş

**toucan** [ˈtu:kən] *n zool.* tukan *(Cənubi Amerikada yaşayan ağacdələnəoxşar quş)*

**touch**[1] [tʌtʃ] *n* **1.** toxunma, əl vurma, dəymə; 2. əlaqə, münasibət, yaxınlıq; **in ~ with** *smb.* bir kəslə təmasda; **to get in ~ with** *smb.* bir kəslə əlaqə saxlamaq; **to lose ~ with** *smb.* bir kəslə əlaqəni itirmək; 3. toxunma hissi, toxunmaqla hiss etmə; lamisə; **soft to the ~** ələ yumşaq dəyən; 4. ştrix, cizgi; **to put the finishing ~es** sonuncu cizgiləri çəkmək; düzəldib qurtarmaq; 5. səciyyəvi xüsusiyyət, xassə, əlamət, cizgi; **personal ~** şəxsi xüsusiyyət; 6. yanaşma, yaxınlaşma *(insanlara)*; ədəb, nəzakət, mərifət; *He has a marvellous touch in dealing with children O, uşaqlarla əla yola gedir/çox yaxşı dolanır;* 7. zərrə, bir az/çimdik; **a ~ of salt** bir çimdik duz; *There was a touch of bitterness in what he said Onun sözlərində bir az acılıq hiss olunurdu;* 8. yüngül tutma *(xəstəlik)*; cüzi zədələnmə/əzilmə; **a ~ of the sun** yüngül gün vurması; 9. tövr, tərz, üsul, qayda *(rəssamda və s.)*; **10.** sınaq, yoxlama, sınama; **to put/to bring to the ~** sınağa çəkmək, sınamaq; **11.** *sl* zorla/hədələməklə/ fırıldaqla qoparma *(pul və s.)*; **12.** qaçdı-tutdu *(uşaq oyunu: həm də* **~ and run**); **13.** *mus.* tuşe *(çalarkən musiqi alətinə toxunma tərzi)*; **14.** *id.* futbol və s. meydanının yan xəttdən kənar meydanı; **in ~** yan xəttdən kənar;

◊ **a ~ typist** cəld/gözüyumulu çap edən makinaçı; **common ~** qonşusu ilə əlaqə saxlamaq bacarığı; yoldaşlıq hissi; **in/within ~** əlinin altında, yaxında



**touch**[2] [tʌtʃ] *v* **1.** toxunmaq, əl vurmaq, dəymək; bir-birinə dəymək, təmas etmək; *Don't touch my papers Mənim kağızlarıma toxunma/toxunmayın; Someone touched me on the shoulder Kimsə mənim çiynimə toxundu; The fire didn't touch the pictures Yanğın şəkillərə dəymədi; He hasn't touched his breakfast O, səhər yeməyinə əlini vurmayıb;* 2. aid/dəxli olmaq, toxunmaq *(mövzuya, məsələyə və s.); It touches your interest closely Bu, bilavasitə sənin/sizin marağına/marağınıza toxunur;* 3. korlamaq, yüngül zərər vermək; *Frost touched the plants Şaxta bitkiləri korladı/bitkilərə zərər vurdu;* **4.** təsir göstərmək; *Nothing will touch these stains Bu ləkələri heç nə aparmaz;* 5. əlaqədə/təmasda olmaq; *How does this touch me? Bunun mənimlə nə əlaqəsi var?* 6. almaq, qoparmaq *(kələklə, fırıldaqla); He touched me for a large sum of money O məndən böyük məbləğdə pul qopartdı;* 7. müqayisə olunmaq, layiq/tay-bərabər olmaq; *Nobody can touch him as a violinist Skripkaçı kimi heç kim ona tay-bərabər ola bilməz;* **to ~ at** *dən.* daxil olmaq *(limana)*; **to ~ down** yerə enmək; **to ~ on** toxunmaq *(mövzuya, məsələyə və s.)*; **to ~** *smb.* **on a sore** bir kəsin yaralı yerinə toxunmaq;

◊ **to ~ shore** üzüb sahilə çıxmaq; **to ~ bottom** 1) son həddə çatmaq *(qiymət haq.)*; 2) məsələnin mahiyyətinə varmaq; **to ~ pitch** şübhəli müəssisə ilə/şəxslə iş görmək; **to ~ the spot** hədəfə/yerinə düşmək; *A glass of iced beer touches the spot on a hot day İsti gündə bir stəkan soyuq pivə yerinə düşür;* **to ~ wood** taleyi rəhmə gətirməyə cəhd etmək; *Touch wood! Göz dəyməsin!*

**touchable** [ˈtʌtʃəbl] *adj* **1.** toxunma hissi, təsirli; 2. hiss olunan, gözəçarpan

**touch-and-go**[1] [ˈtʌtʃənˈgou] *n* təhlükəli iş, xətərli iş/vəziyyət; *It was touch-and-go for a while Bir müddət hər şey tükdən asılı idi*

**touch-and-go**[2] [ˈtʌtʃənˈgou] *adj* **1.** qorxulu, təhlükəli, xatalı; 2. natamam, qırıq, rabitəsiz

**touch-down** [ˈtʌtʃdaun] *n* **1.** *av.* yerə enmə/oturma *(təyyarə)*; **to make a ~** yerə enmək/düşmək *(təyyarə haq.)*; 2. *id.* qol, topu qapıdan keçirmə *(reqbi oyununda)*

**touched** [tʌtʃt] *adj* **1.** toxunulmuş; əsəbi; **2.** təlatümlü, dalğalanmış; həyəcanlı;

◊ **~ in the wind** təngnəfəslikdən əziyyət çəkən, tövşüməyə mübtəla olan

**touchiness** [ˈtʌtʃɪnɪs] *n* küsəyənlik, tez küsmə /incimə, dəymədüşərlik

**touch-line** [ˈtʌtʃlaɪn] *n id.* yan xətt

**touch-me-not** [ˈtʌtʃmɪˈnɔt] *n.* **1.** dəymədüşər; **2.** qadağan olunmuş mövzu; 3. *bot.* xınagülü



**touch-needle** [ˈtʌtʃˌni:dl] *n* prob vurma iynəsi

**touchstone** [ˈtʌtʃstoun] *n* məhək daşı; bülöv, bülöv daşı

**touchwood** [ˈtʌtʃwud] *n* **1.** ağacgöbələyi; **2.** çürük ağac

**touchy** [ˈtʌtʃɪ] *adj* **1.** küsəyən, tez küsən/inciyən, dəymədüşər; **2.** həddindən artıq hissiyyatlı

**tough**[1] [tʌf] *n d.d.* huliqan, dələduz

**tough**[2] [tʌf] *adj* **1.** bərk, sərt, cod, qaba, möhkəm; **as ~ as leather** dəri kimi bərk, altlıq kimi bərk *(ayaqqabının və s.)*; **~ meat** bərk ət; **~ policy** sərt siyasət; **2.** çətin; **a ~ job** çətin iş; **a ~ problem** çətin problem; **3.** dözümlü, davamlı, möhkəm, inadlı; **~ resistance** inadlı müqavimət; **4.** islaholunmaz, düzəldilməz; **a ~ criminal** islahedilməz cinayətkar; **5.** sərt, kobud *(adam)*; **6.** *geol.* bərk, möhkəm *(süxur haq.)*

**toughen** [ˈtʌfn] *v* bərkitmək, möhkəmlətmək; sərtləşmək, qatılaşmaq

**toupee** [ˈtu:peɪ] *n* **1.** parik *(qoyma/süni saç)*; **2.** kəkil

**tour**[1] [tuəʳ] *n* **1.** səyahət, səfər; ekskursiya; **a foreign ~** xarici səfər; **a round-the-world ~** dövrüaləm səyahəti; **a coach ~ of Scotland** Şotlandiyada avtobusla səyahət; **a walking ~** yürüş; **2.** dövrə, tur; gəzib dolanma; 3. *teatr.* qastrol, qastrol səfəri; *The ballet is on tour in America Balet indi Amerikada qastrol səfərindədir;* 4. gözətçini yoxlama; dəymə, baş çəkmə; 5. sahə, dairə *(vəzifə, fəaliyyət və s.)*; 6. növbə *(fabrikdə və s.)*

**tour**[2] [tuəʳ] *v* **1.** səyahət etmək; səfərə çıxmaq/ getmək; **to ~ (through) a country** ölkəyə səfər etmək; ölkəni gəzməyə çıxmaq; **2.** gəzib dolaşmaq; 3. *teatr.* qastrola gəlmək/çıxmaq; qastrol səfərində göstərmək *(tamaşa və s.); They toured "Otello" Onlar qastrol səfərində "Otello"nu göstərdilər; The play is touring in the provinces Truppa bu pyeslə əyalətələrə qastrol səfərinə gedir*

**touring-car** [ˈtuərɪŋka:ʳ] *n* turist avtomobili

**tourism** [ˈtuərɪzm] *n* turizm

**tourist** [ˈtuərɪst] *n* turist, səyyah, səyahətçi

**tournament** [ˈtuənəmənt] *n* yarış; **chess ~** şahmat yarışı

**tourney**[1] [ˈtuənɪ] *n tar.* yarış *(orta əsrlərdə)*

**tourney**[2] [ˈtuənɪ] *v* yarışda mübarizə aparmaq, mübarizə etmək, müqavimət göstərmək

**tourniquet** [ˈtuənɪkeɪ] *n tib.* turniket *(qanı dayandırmaq üçün xüsusi sıxac)*

**tousle** [ˈtauzl] *v* qarışdırmaq, dolaşdırmaq, dolaşıq/ pırtlaşıq salmaq

**tow**[1] [tou] *n* **1.** buraz, kəndir; tros; **2.** yedəkləmə, yedəyə alma; 3. yedək gəmisi; **4.** yedək karvanı/ qafiləsi; 5. darama, daranma *(kətan, yun və s.)*; 6. kəpitkə, kilkə, lif;

◊ **to take in ~** 1) yedəyə almaq; 2) hamiliyə götürmək, himayə etmək

**tow**[2] [tou] *v* **1.** dartmaq *(yedəkdə); A horse towed the canal boat At kanal qayığını yedəyə aldı;* **2.** yedəkləmək, yedəyə almaq, yedəyinə alıb aparmaq



**towage** [ˈtouɪdʒ] *n* **1.** yedəkləmə, yedəyə alma; **2.** yedək haqqı/pulu

**toward(s)** [təˈwɔ:d(z)] *prep* **1.** doğru, istiqamətində; tərəf; **to swim ~ the shore** sahilə tərəf/doğru üzmək; *He had his back turned towards me O, arxası mənə tərəf dayanmışdı; He eyed towards the door O, çaşqınlıqla qapıya tərəf baxdı;* 2. əlaqə, münasibət; haqqında, barəsində, dair; **attitude ~ art** incəsənətə münasibət; *They are hostile towards us Onlar bizə düşmən münasibəti bəsləyirlər; What's your feeling towards them? Sənin/Sizin onlara münasibətin/ münasibətiniz necədir?;* 3. üçün, məqsədlə; *We are saving towards a new house Biz təzə ev almaq üçün pul yığırıq;* 4. yaxın, doğru; *It became cold towards morning Səhərə yaxın soyuqlaşdı; He came towards evening O, axşama yaxın gəldi;* **~ the end of the month** ayın axırına/sonuna yaxın; **~ two o'clock** saat ikiyə yaxın

**tow-boat** [ˈtoubout] *n* yedək qayığı/gəmisi

**towel**[1] [ˈtauəl] *n* dəsmal, məhrəba

**towel**[2] [ˈtauəl] *v* dəsmalla silmək; dəsmalla qurulamaq; **to ~ oneself** dəsmalla qurulanmaq

**towel-horse** [ˈtauəlhɔ:s] *n* dəsmal/ məhrəba üçün asılqan

**towel-rack** [ˈtauəlræk] *n* = **towel-horse**

**tower**[1] [ˈtauəʳ] *n* **1.** qala; **The Maiden Tower** Qız qalası; 2. bürc, qüllə; istehkam; **The Eiffel Tower** Eyfel qülləsi; 3. *məc.* dayaq, dirək, istinad, istinadgah; *He was a tower of strength to me O mənim etibarlı dayağım idi;* 4. *tex.* vışka, buruq

**tower**[2] [ˈtauəʳ] *v* **1.** ucalmaq, yüksəlmək; *The skyscrapers tower above the city Göydələnlər şəhərin üzərinə səmaya ucalırlar;* 2. hündür olmaq; *He towers above the girl O, qızdan hündürdür; The giraffe towers over other animals Zürafə başqa heyvanlardan hündürdür*

**towering** [ˈtauərɪŋ] *adj* **1.** çox uca/hündür; yüksək, yüksələn, ucalan; 2. artan, böyüyən, inkişaf edən; şiddətli, bərk, sərt; **in a ~ rage** qəzəblə, acıqla, azğınlıqla

**tow-head** [ˈtouhed] *n* **1.** açıq parlaq saç; 2. parlaq saçlı adam

**towing-path** [ˈtouɪŋpa:θ] *n dən.* ləpədöyən yol

**tow-line** [ˈtoulaɪn] *n* yedək, yedək ipi; yedək trosu

**town**[1] [taun] *n* **1.** şəhər; **small ~** kiçik şəhər; 2. şəhər sakinləri; *He became the talk of the town Onun haqqında bütün şəhər sakinləri danışdı. O, şəhərdə dil-ağıza düşdü;* 3. inzibati mərkəz *(rayonun, mahalın)*;

◊ **a man about ~** kübar /tərbiyəli adam; **~ and gown** Oksford və ya Kembric sakinləri *(tələbələr və professorlar da daxil olmaqla)*

**town**[2] [taun] *adj* şəhər; **~ counsil** şəhər bələdiyyə şurası; **~ residence** şəhər mənzili; **~ mains** şəhər magistralları

**town hall** ['taun'hɔ:l] *n* ratuşa *(şəhər idarəsi/ bələdiyyə binası)*
**town planning** ['taun'plænɪŋ] *n* şəhərsalma, şəhərplanlaşdırma
**townsfolk** ['taunzfouk] *n pl* şəhərlilər, şəhər sakinləri
**townsman** ['taunzmən] *n (pl* **-men** [-mən] **1.** şəhərli, şəhər adamı; **2.** həmşəhərli
**townspeople** ['taunz.pi:pl] *n* = **townsfolk**
**toxaemia** [tɔk'si:mɪə] *n tib.* qanın zəhərlənməsi, toksemiya
**toxic** ['tɔksɪk] *adj* zəhərli, zəhərləyici
**toxicology** [.tɔksɪ'kɔlədʒɪ] *n* toksikologiya *(zəhərlərdən bəhs edən elm)*
**toxicosis** [.tɔksɪ'kousɪs] *n tib.* toksikoz *(bədənin zəhərli maddələrin təsirindən zəhərlənməsi)*
**toxin** ['tɔksɪn] *n tib.* zəhər
**toy**[1] [tɔɪ] *n* **1.** oyuncaq; əyləncə; **a ~ soldier** oyuncaq əsgər; **2.** *məc.* fəaliyyət göstərməyən ordunun əsgəri
**toy**[2] [tɔɪ] *v* **1.** oynamaq; əlində oynatmaq; **2.** götür-qoy etmək, fikrində fırlatmaq; *I'm toying with the idea of going to Finland Finlandiyaya getməyi hələ götür-qoy edirəm*
**toyman** ['tɔɪmən] *n* **1.** oyuncaqsatan, oyuncaq alverçisi; **2.** oyuncaq ustası
**toyshop** ['tɔɪʃɔp] *n* oyuncaqlar dükanı
**trace**[1] [treɪs] *n* **1.** iz, ləpir; **to disappear without a ~** izsiz yoxa çıxmaq/yox olmaq; **to keep ~ of smth.** bir şeyi izləmək; **2.** *məc.* iz, əsər, əlamət, əsər-əlamət, nişanə; *His face showed traces of tears Onun üzündə göz yaşları izləri vardı; So far there is no trace of survivors Hələ sağ qalanlar haqqında xəbər-ətər yoxdur*; **3.** cizgi, çertyoj; **4.** cüzi miqdar, az say(da); **not a ~ of evidence** heç bir sübut yox; **5.** qayış, yan qayış *(qoşquda)*
**trace**[2] [treɪs] *v* **1.** xətləmək, cizgiləmək, cızmaq *(plan, çertyoj və s.)*; **2.** izləmək, izinə düşmək, pusmaq; *The hunter traced the lion to his den Ovçu pələngi yuvasınadək izlədi*; **3.** surətini çıxartmaq *(şəffaf kağız və ya parça ilə)*; **4.** müəyyən etmək, görmək; *I cannot trace any connection to the event Mən hadisə ilə heç bir əlaqə görmürəm*; **5.** aşkar etmək, üstünü açmaq, müəyyən etmək; *The police were unable to trace the whereabouts of the missing girl Polis itkin düşmüş qızın yerini müəyyən edə bilmədi*; **6.** çətinliklə fərqləndirmək/ayırd etmək; **7.** gedib çıxmaq, aid olmaq *(keçmişə, keçmişdə müəyyən dövrə)*; *This custom has been traced to the twelfth century Bu adət on ikinci əsrə gedib çıxır; This family traces to the Norman Conquest Bu nəslin kökləri norman istilası dövrünə gedib çıxır*; **8.** yazıb təsbit etmək, yazmaq, qeyd etmək; **9.** naxış/ bəzək vurmaq, naxışlamaq
**tracer** ['treɪsər] *n* **1.** itirilmiş əşyalar üzrə agent *(əsas. dəmir yolunda)*; **2.** itmiş əşyalar/yüklər üzrə sorğu; **3.** çertyoj çəkən; surət çıxardan *(şəxs)*; **4.** tədqiqatçı; izləyici; **5.** sınmış/zədələnmiş yeri axtarıb tapmaq üçün cihaz; **6.** *hərb.* uçarkən havada iz buraxan güllə/mərmi; **7.** qoşqu atı
**tracery** ['treɪsərɪ] *n* **1.** naxış, bəzək, gül; **2.** şəbəkə işi *(orta əsrlər incəsənətində)*
**trachea** [trə'ki:ə] *n anat.* traxeya, nəfəs yolu
**tracheotomy** [.trækɪ'ɔtəmɪ] *n tib.* traxeotomiya *(nəfəs borusunda operasiya vasitəsilə deşik açılması)*
**trachoma** [trə'koumə] *n tib.* traxoma *(göz xəstəliyi)*
**track**[1] [træk] *n* **1.** iz, ləpir; **~s on the snow** qar üstündə izlər; **to be on the ~ of** izinə düşmək; **to put someone on the ~ of** bir kəsi izə salmaq; **to be in the ~ of smb.** bir kəsi izləmək; **to lose ~ of** izi itirmək; **to keep the ~ of events** hadisələri izləmək, hadisələrdən xəbərdar olmaq; **2.** yol, cığır; **3.** həyat/ömür yolu; **off the ~** yolundan çıxmış, yolunu azmış; **4.** *tex.* rels; yol; **to lay ~s** rels düzmək, yol salmaq; **to go off the ~s** relsdən çıxmaq; *What track does the train leave on? Qatar hansı yoldan (platformadan) yola düşür?*; **5.** *id.* trek, yol; **running ~** qaçış yolu; **6.** *id.* yüngül atletika; **7.** tırtıl; enli zəncir *(traktorda, tankda və s.)*; **8.** uçuş marşrutu;
◊ **on the inside ~** *amer.* əlverişli vəziyyətdə; **off the ~** mövzudan uzaqlaşma; **on the right /wrong ~** *amer.* düz/əyri yolda
**track**[2] [træk] *v* **1.** izləmək, izinə düşmək; güdmək, pusmaq; **2.** *amer.* iz qoymaq/salmaq, ləpir salmaq; **3.** yol salmaq/açmaq; **4.** rels düzmək, yol salmaq; **5.** kəndir/buraz dartmaq; **to ~ down** izləyib tutmaq
**trackage** ['trækɪdʒ] *n amer.* **1.** dəmiryol şəbəkəsi; **2.** hüquq *(bir dəmiryol şirkətinin digər dəmiryol şirkətinə məxsus yollardan istifadə etmə hüququ)*
**track-and-field** ['trækən'fi:ld] *n id.* yüngül atletika
**tracker** ['trækər] *n* **1.** vəhşi heyvanları izləyən ovçu; **2.** xəfiyyə; **3.** *dən.* qayış; kəndir; **4.** yedək ipi
**tracklayer** ['træk.leɪər] *n* dəmiryol fəhləsi, relsdüzən fəhlə
**track-shoe** ['trækʃu:] *n* tırtılın həlqəsi, zəncir həlqəsi
**trackwalker** ['træk.wɔ:kər] *n amer.* yol baxıcısı/ nəzarətçisi
**trackway** ['trækweɪ] *n* **1.** cığır; **2.** təkər izi olan yol
**tract** [trækt] *n* **1.** elmi əsər; kitabça; **2.** boşluq, boş sahə; **3.** *anat.* həzm aparatı
**tractable** ['træktəbl] *adj* itaətli, itaətkar, sözəbaxan, sözə qulaq asan; **to be ~ as a child** uşaq kimi itaətli olmaq; *Gold is tractable Qızıl asan döyüləndir*
**tractate** ['træktəɪt] *n* traktat; elmi əsər
**tractile** ['træktaɪl] *adj* uzana /döyülə bilən *(metal haq.)*
**traction** ['trækʃn] *n* **1.** *tex.* hərəkət/dartma qüvvəsi, dartıcı qüvvə; **electric ~** elektrik dartma



qüvvəsi; **2.** bağlanma/qoşulma qüvvəsi; **3.** *amer.* şəhər nəqliyyatı
**tractor** ['træktər] *n* traktor
**tractor-driver** ['træktə.draɪvər] *n* traktorçu, traktor sürən
**trade**[1] [treɪd] *n* **1.** məşğuliyyət, peşə, sənət; **the ~ of war** hərb sənəti; **2.** ticarət; **home ~** daxili ticarət; **foreign ~** xarici ticarət; **fair ~** qarşılıqlı faydalı ticarət; **3.** ticarətçi, alverçi; **the woollen ~** yun satan, yun alverçisi; **4.** pərakəndə satış; **5.** sövdələşmə
**trade**[2] [treɪd] *adj* ticarət; **~ mark** ticarət markası/ nişanı; **~ balance** ticarət balansı
**trade**[3] [treɪd] *v* **1.** alver/ticarət etmək; ticarətlə/alverlə məşğul olmaq; *This company trades in tea Bu şirkət çay ticarəti ilə məşğul olur; Our country trades with other countries Bizim ölkəmiz digər ölkələrlə ticarət edir; While we traded with him... Biz onunla sövdələşəndə...*; **2.** mübadilə etmək, dəyişmək; *Let's trade Gəl/Gəlin dəyişək; I traded my stamp collection for a camera Mən marka kolleksiyamı fotoaparata dəyişdim*
**Trade Board** ['treɪd'bɔ:d] *n* əmək haqqı məsələləri üzrə komissiya
**trade mission** ['treɪd'mɪʃn] *n* ticarət nümayəndəliyi
**trade price** ['treɪd'praɪs] *n.* fabrik /topdansatış qiyməti
**trader** ['treɪdər] *n* **1.** alverçi, ticarətçi, tacir; **2.** ticarət gəmisi; **3.** birja dəllalı
**tradesman** ['treɪdzmən] *n (pl* **-men** [-mən]) alverçi, tacir; dükançı
**tradespeople** ['treɪdz.pi:pl] *n top.i* **1.** tacirlər, dükançılar və onların ailə və qulluqçuları; **2.** ticarətçilər silki/ təbəqəsi
**tradeswoman** ['treɪdz.wumən] *n (pl* **-women** [-wɪmɪn]) alverçi qadın; dükançı qadın
**trade union**[1] ['treɪd'ju:njən] *n* həmkarlar ittifaqı
**trade union**[2] ['treɪd'ju:njən] *adj* həmkarlar; **~ organization** həmkarlar ittifaqı təşkilatı
**trade unionist** ['treɪd'ju:njənɪst] *n* həmkarlar ittifaqının üzvü
**trade winds** ['treɪdwɪndz] *n pl* passat *(tropik ölkələrlə ekvator arasındakı sahədə əsən quru külək)*
**trading**[1] ['treɪdɪŋ] *n* ticarət, alver
**trading**[2] ['treɪdɪŋ] *adj* ticarət; **a ~ contract** ticarət müqaviləsi; **a ~ company** ticarət şirkəti
**tradition** [trə'dɪʃn] *n* ənənə; **by ~** ənənəyə görə; *It's a tradition to eat turkey at Thanksgiving Şükranlıq bayramı günündə hinduşka əti yemək bir ənənədir*
**traditional** [trə'dɪʃənl] *adj* ənənəvi; adəti üzrə, nəsildən-nəslə keçən
**traditionally** [trə'dɪʃnəlɪ] *adv* ənənəyə görə, ənənəvi olaraq
**traduce** [trə'dju:s] *v* dalca danışmaq, qeybət etmək, pisləmək; böhtan atmaq, iftira etmək
**traffic**[1] ['træfɪk] *n* **1.** hərəkət; nəqliyyat; **2.** *dən.* fraxt, yüklər; **3.** ticarət; **to carry on ~** ticarət etmək, alıb-satmaq; **~ in votes** səslərin alveri *(seçkilərdə)*
**traffic**[2] ['træfɪk] *adj* nəqliyyata dair, nəqliyyat üzrə; yol; **a ~ officer/cop** küçə hərəkətini tənzimləyən zabit/polis; **a ~ controller** dispetçer; **~ jam** probka, tıxac, əngəl, maneə; **a ~ light** svetofor; **a ~ sign** yol hərəkəti nişanı; **a ~ accident** yol qəzası
**traffic**[3] ['træfɪk] *v* alver/ticarət etmək, alverlə məşğul olmaq; **to ~ in fruit with Italy** İtaliya ilə meyvə alveri etmək
**trafficker** ['træfɪkər] *n* alverçi, ticarətçi; **a drug ~** narkotik maddələr alverçisi
**tragedian** [trə'dʒi:djən] *n* **1.** faciə aktyoru, tragik aktyor; **2.** faciə müəllifi
**tragedy** ['trædʒɪdɪ] *n* **1.** tragediya, faciə, müsibət; **to end in ~** faciə ilə başa çatmaq, müsibətlə sona yetmək; **2.** tragizm, faciəlilik, sarsıdıcılıq, dəhşət
**tragic** ['trædʒɪk] *adj* **1.** tragik, faciəli; **a ~ tale** faciəli nağıl; **2.** dəhşətli, qorxulu, qorxunc, müdhiş; **a ~ accident** dəhşətli hadisə
**tragical** ['trædʒɪkl] *adj* = **tragic**
**tragically** ['trædʒɪkəlɪ] *adv* faciəli surətdə, facianə; **to end ~** faciəli surətdə qurtarmaq/sona çatmaq
**tragicomedy** ['trædʒɪ'kɔmɪdɪ] *n* faciəli komediya
**trail**[1] [treɪl] *n* **1.** ləpir, iz; nişanə, əlamət; *He left a trail of mud on the carpet O, xalçanın üstündə palçıq izləri qoydu*; **2.** iz *(insanın, heyvanın)*; **to be on the ~ of smb.** bir kəsi izləmək, bir kəsin izinə düşmək; **to foul the ~** izi dolaşdırmaq/azdırmaq; **to get on the ~** izə düşmək; **3.** cığır, yol; *The trail through the woods is overgrowing with bushes Meşədən keçən cığırı/yolu kol-kos basır*; **4.** zoğ, cavan budaq
**trail**[2] [treɪl] *v* **1.** izləmək, izlə getmək; **to ~ a deer/a criminal** maralı/cinayətkarı izləmək; **2.** arxasınca getmək *(bir kəsin/şeyin)*; *We trailed the car in front of us Biz qabağımızdakı maşının arxasınca getdik*; **3.** yol salmaq/ açmaq, cığırı tapdalamaq; **4.** sürümək, dartıb aparmaq; *The child trailed his toy car on a piece of string Uşaq ipə bağlanmış oyuncaq maşınını sürüdü*; **5.** sürünmək, yavaş-yavaş getmək; **to ~ along the ground** yerdə sürünmək; **6.** gətirmək; **to ~ dirt into the house** çirki evə gətirmək; **7.** geri qalmaq, arxada getmək; **8.** uzanıb getmək; *Smoke trailed from the chimney Tüstü bacadan uzanıb getdi*; **9.** dağınıq halda getmək; **10.** sallanmaq *(saç haq.)*; **11.** sərilmək, yayılmaq *(bitki haq.)*; *Creepers trailed over roofs and walls Sarmaşıqlar damlara və divarlara yayılmışdı/ sərilmişdi*; **12.** şirnikdirmək, aldatmaq, tovlamaq;
◊ **to ~ one's coat** özünü ədabaz/həyasız aparmaq, dava-dalaşa qoşulmaq/girişmək
**trail-blazer** ['treɪl.bleɪzər] *n* novator, yenilikçi; pioner

**trailer** ['treɪlə^r] *n* **1.** dartan, sürüyən *(adam, heyvan)*; **2.** qoşma, qoşulan araba; treyler; **3.** sürünən bitki; **4.** kino afişası

**trail-net** ['treɪlnet] *n dən.* tral, balıq toru

**train**[1] [treɪn] *n* **1.** qatar, düzüm; **by ~** qatarla; **a mixed ~** yük və sərnişin qatarı; **a goods ~** yük qatarı; **a wild ~** cədvəldənkənar qatar; *The train is off Qatar yola düşür*; **to catch/to make the ~** qatara çatmaq; **2.** təntənəli nümayiş, kütləvi yeriş; mərasim; **funeral ~** dəfn mərasimi; **3.** karvan, qatar; **a ~ of camels** dəvə karvanı; **4.** silsilə, zəncir; cərgə, sıra, düzüm *(hadisə, fikir haq.)*; **~ of thought** fikir düzümü; **a ~ of misfortunes** bədbəxtliklər silsiləsi; **5.** nəticə, aqibət; **in the ~ of** nəticədə; **6.** şleyf, quyruq *(qadın paltarının yerlə sürünən uzun dal ətəyi)*; **7.** svita, dəstə *(azarkeşlər)*; **8.** *tex.* dişli ötürücü

**train**[2] [treɪn] *v* **1.** öyrətmək, təlim keçmək/vermək; **2.** məşq etmək, inkişaf etdirmək; **to ~ for races** cıdır yarışlarına hazırlaşmaq; **3.** öyrətmək, təlim etmək *(heyvanı)*; yerişə öyrətmək *(atı)*; **4.** tuşlamaq, nişan almaq, yönəltmək *(aləti, obyektivi)*; **5.** *d.d.* dəmir yolu ilə getmək

**train-bearer** ['treɪn.beərə^r] *n tar.* paj *(orta əsrlərdə sarayda xidmət edən zadəgan nəslindən oğlan)*

**trained** [treɪnd] *adj* **1.** təlim almış/görmüş; hazırlıqlı; **a poorly ~ army** pis təlim görmüş ordu; **2.** təcrübəli, mahir; **a ~ nurse** təcrübəli şəfqət bacısı/dayə; **3.** öyrədilmiş, təlim görmüş *(heyvan haq.)*; **a ~ horse** öyrədilmiş at

**trainee** [treɪ'ni:] *n* hazırlıq keçən, təlim alan, təcrübə keçən, təcrübəçi

**trainer** ['treɪnə^r] *n* **1.** təlimatçı; **2.** məşqçi, təlimçi; **3.** *hərb.* üfüqi tuşlayıcı

**train-ferry** ['treɪn'ferɪ] *n* dəmiryol bərəsi/salı

**training**[1] ['treɪnɪŋ] *n* **1.** təlim; **2.** hazırlıq; **on the job ~** iş yerində hazırlıq keçmə; **3.** məşq; **4.** tərbiyə, tərbiyə etmə /edilmə; **5.** öyrətmə, təlim etmə *(heyvanları)*

**training**[2] ['treɪnɪŋ] *adj* təlim; **~ flight** təlim uçuşu

**training-college** ['treɪnɪŋ'kɔlɪdʒ] *n* pedaqoji institut

**training-school** ['treɪnɪŋsku:l] *n* **1.** texnikum; **2.** islah-əmək koloniyası/düşərgəsi

**training-ship** ['treɪnɪŋʃɪp] *n dən.* təlim gəmisi

**trainmaster** ['treɪn.ma:stə^r] *n amer.* qatar rəisi; baş bələdçi

**train-oil** ['treɪnɔɪl] *n* dəniz heyvanlarının (balina, suiti və s.) əridilmiş piyi

**train-service** ['treɪn.sə:vɪs] *n d.y.* hərəkət xidməti

**train staff** ['treɪnsta:f] *n* qatar briqadası

**train table** ['treɪn'teɪbl] *n* qatarların hərəkət qrafiki/ cədvəli

**trait** [treɪt] *n* səciyyəvi xüsusiyyət/cəhət

**traitor** ['treɪtə^r] *n* xain, satqın, dönük, cinayətkar; **~ to *one's* country** vətən xaini/satqını

**traitorous** ['treɪtərəs] *adj* xain, xaincəsinə, satqıncasına

**traitorously** ['treɪtərəslɪ] *adv* xaincəsinə, satqıncasına, namərdcəsinə

**traitress** ['treɪtrɪs] *n* xain/satqın/dönük qadın

**trajectory** ['trædʒɪktərɪ] *n* trayektoriya *(atılan güllənin cızdığı əyri xətt)*

**tram**[1] [træm] *n* **1.** tramvay; **2.** vaqonet, kiçik vaqon *(şaxtada, mədəndə və s.)*

**tram**[2] [træm] *v* **1.** tramvayla getmək; **2.** diyirlətmək, yuvarlatmaq *(arabanı, vaqonu)*

**tram-line** ['træmlaɪn] *n* tramvay xətti/yolu

**trammel**[1] ['træməl] *n* **1.** *məc.* əngəl, maneə, ilişik; **2.** tor *(böyük balıq tutmaq üçün)*, tral; **3.** quş toru; **4.** ellipsoqraf *(ellips çəkmək üçün alət)*

**trammel**[2] ['træməl] *v* **1.** torla tutmaq; **2.** maneə törətmək, əngəl yaratmaq

**tramp**[1] [træmp] *n* **1.** sərsəri, səfil, avara; **2.** *d.d.* uzun və yorucu piyada səfər; **3.** ağır addım səsi; **4.** *dən.* yük paroxodu

**tramp**[2] [træmp] *v* **1.** ayaq basmaq, ağır-ağır yerimək, addım atmaq; *We tramped up and down the platform Biz platformada ağır-ağır aşağı-yuxarı gəzdik*; **2.** veyllənmək, avaralanmaq, dolaşmaq; *I tramped the streets all day looking for a flat Mənzil axtara-axtara mən bütün günü küçələrdə dolaşdım/ veylləndim*; **3.** piyada getmək/gəzmək; **4.** ayaqlamaq, əzmək, ayaqla basıb əzmək

**trample**[1] ['træmpl] *n* **1.** tapdalama, ayaqlama; **2.** ayaq altına salma; kobudcasına pozma

**trample**[2] ['træmpl] *v* **1.** tapdalamaq, ayaqlamaq *(çəmənliyi, əkini)*; *The buffaloes trampled the crops Camışlar məhsulu ayaqladılar*; **2.** əzmək *(üzümü, tutu və s.)*; **3.** basmaq, ayaq altına salmaq, toxunmaq; kobudcasına pozmaq *(qanunu, başqasının hüququnu və s.)*; *He tramped on /upon the girl's feelings O, qızın hisslərinə toxundu*

**tramway** ['træmweɪ] *n* tramvay xətti/yolu

**trance** [tra:ns] *n tib.* trans, özündən getmə, huşunu itirmə; **to fall into a ~** huşunu itirmək, özündən getmək

**tranquil** ['træŋkwɪl] *adj* sakit, dinc; **~ waters** sakit sular; **a ~ mood** sakit əhvali-ruhiyyə; **~ life** dinc həyat

**tranquillity** [træŋ'kwɪlɪtɪ] *n* sakitlik, dinclik

**tranquillize, -ise** ['træŋkwɪlaɪz] *v* sakitləşmək, sakit/ rahat olmaq; sakit/rahat etmək

**tranquillizer, -iser** ['træŋkwɪlaɪzə^r] *n tib.* ağrıkəsən *(dərman)*, sakitləşdirici

**transact** [træn'zækt] *v* **1.** aparmaq *(işi)*; **2.** bağlamaq *(müqavilə, sövdələşmə və s.)*

**transaction** [træn'zækʃn] *n* **1.** iş; sövdələşmə; alış-veriş; **2.** *pl* əsərlər, protokollar *(elmi cəmiyyətin)*; **3.** *hüq.* tərəflərin razılığı ilə muqavilənin nizama salınması

**transatlantic**[1] ['trænzət'læntɪk] *n* transatlantik paroxod *(Atlantik okeanında işləyən paroxod)*

**transatlantic**[2] ['trænzət'læntɪk] *adj* transatlantik

**transcalent** [træns'keɪlənt] *adj fiz.* istilikkeçirən

**transcend** [træn'send] *v* **1.** hüquqları/həddi aşmaq; **to ~ the limits of decency** ədəb qaydalarının hədlərini aşmaq; **2.** ötüb keçmək, üstün gəlmək, ötmək, geridə buraxmaq; *It transcended all my hopes Bu mənim bütün ümidlərimi ötüb keçdi*



**transcendent** [træn'sendənt] *adj* **1.** üstünlük təşkil edən, artıq olan; **2.** üstün, artıq; qeyri-adi

**transcendental** [.trænsen'dentl] *adj* **1.** *fəls.* transsendental; **2.** *riyaz.* transsendent *(cəbr əməli vasitəsilə hesablanıla bilməyən)*; **3.** mücərrəd; dumanlı, aydın olmayan

**transcendentalism** [.trænsen'dentəlɪzm] *n fəls.* transsendentalizm *(idrakın təcrübədən asılı olmadığını iddia edən idealist fəlsəfi cərəyan)*

**transcontinental** ['trænz.kɔntɪ'nentl] *adj* transkontinental, qitələrarası

**transcribe** [træns'kraɪb] *v* **1.** üzünü köçürtmək/ ağartmaq; **2.** stenoqrafik yazının şifrini açmaq; **3.** maqnit lentinə yazmaq *(veriliş üçün)*; **4.** transkripsiyasını yazmaq/vermək; **5.** *mus.* bəstələmək, tərtib etmək, uyğunlaşdırmaq

**transcript** ['trænskrɪpt] *n* **1.** surət, üz, kopiya; **2.** şifrini açma *(stenoqrafik yazının)*; **stenographic ~** stenoqram

**transcription** [træns'krɪpʃn] *n* **1.** *fon.* transkripsiya; **phonetic ~** fonetik transkripsiya; **2.** surət, üz; **3.** səs yazısı *(radio verilişi üçün)*; **electrical ~** mexaniki səs yazısı; **4.** bəstələmə, tərtib etmə, uyğunlaşdırma

**transect** [træn'sekt] *v* köndələn/ eninə kəsmək

**transfer**[1] ['trænsfə:^r] *n* **1.** vermə *(əmlakı, pulu və s.)*; **2.** keçirmə, baratlama, köçürmə; **3.** *hüq.* ötürmə, vermə *(səlahiyyəti)*; **4.** köçürmə *(şəkli və s.)*; **5.** dəyişmə *(qatar, paroxod və s.)*; **6.** *amer.* dəyişmə *(bileti)*

**transfer**[2] [træns'fə:^r] *v* **(-rr-) 1.** daşımaq, aparmaq, köçürmək, keçirmək, yerini dəyişdirmək; *He transferred his notes to another notebook O, qeydlərini başqa dəftərə köçürdü*; **to ~ a child to another school** uşağı başqa məktəbə keçirmək/ köçürmək; *He is being transferred to another section Onu başqa bölməyə keçirirlər; The office is soon being tranferred to another building İdarəni tezliklə başqa binaya köçürəcəklər*; **2.** *müh.* vermək *(əmlakı, pulu və s.)*, keçirmək, başqa hesaba yazmaq; **3.** göndərmək, barat etmək

**transferable** [træns'fə:rəbl] *adj* ötürülə/dəyişdirilə bilən, başqasına verilə bilən; *All parts of the machine were standard and transferable Maşının bütün hissələri standart və dəyişdirilə/əvəz edilə bilən idi*

**transference** ['trænsfərəns] *n* **1.** ötürmə, ötürülmə; vermə, verilmə; **2.** köçürmə, köçürülmə; keçirmə, keçirilmə

**transfer-ink** [træns'fə:ɪŋk] *n* mətbəə rəngi/boyası

**transfiguration** [.trænsfɪgju'reɪʃn] *n* şəklini/simasını dəyişmə, başqa şəklə düşmə

**transfigure** [træns'fɪgə^r] *v* şəklini/ simasını dəyişdirmək, başqalaşdırmaq

**transfix** [træns'fɪks] *v* **1.** deşmək, dəlmək; sancmaq; vurub deşmək, dəlib keçmək; **2.** *məc.* abrını verib yerində oturtmaq, susdurmaq; *He was transfixed with horror O, dəhşətdən yerində donub qaldı*

**transform** [træns'fɔ:m] *v* **1.** çevrilmək, döndərmək; ...şəklinə/halına salmaq; *The barn was transformed into a house Anbarı düzəldib otaq halına saldılar*; **2.** dəyişmək, dəyişilmək; dəyişdirilmək, tanınmaz olmaq; **to ~ *smth.* beyond recognition** bir şeyi tanınmaz dərəcədə dəyişdirmək; **3.** kökündən dəyişdirmək, tam başqa şəklə salmaq; *The country has been transformed Ölkə tam dəyişib; You'd never recognize their flat for it's quite transformed Sən/Siz onların mənzilini görsən/görsəniz tanıya bilməzsən/bilməzsiniz, çünki o, tam dəyişmişdir*

**transformation** [.trænsfə'meɪʃn] *n* **1.** çevrilmə, dönmə; **to undergo ~** dəyişmək, dəyişikliyə məruz qalmaq; **2.** *el.* transformasiya *(dəyişən elektrik cərəyanının transformator vasitəsilə artırılıb azaldılması)*; **3.** *riyaz.* dəyişmə, başqa şəklə düşmə; **4.** qadın pariki *(qoyma/süni saç)*

**transformer** [træns'fɔ:mə^r] *n* **1.** islahatçı, islahçı; **2.** *el.* transformator

**transfuse** [træns'fju:z] *v* **1.** *tib.* köçürmək *(xüs. qan)*; tökmək; **2.** ruhlandırmaq; *The victory transfused courage into the team Qələbə komandanı ruhlandırdı*

**transfusion** [træns'fju:ʒn] *n tib.* köçürmə; **blood ~** qan köçürmə

**transgress** [træns'gres] *v* **1.** pozmaq, üstündən keçmək, riayət/əməl etməmək *(qanuna, qaydaya və s.)*; **2.** həddini aşmaq; *Your guest's remark transgressed the limits of decency Sənin/Sizin qonağının/qonağınızın atmacaları nəzakət həddini aşdı*; **3.** xata etmək, zidd getmək, pozmaq

**transgression** [træns'greʃn] *n* **1.** günah, xəta; qanunu pozma, cinayət; **2.** *geol.* transqressiya *(qurunun bir sahəsini dənizin basması)*

**transgressor** [træns'gresə^r] *n* qanunu pozan, cinayətkar; **2.** günahkar, günah işləyən *(adam)*

**transience** ['trænzɪəns] *n* anilik, çox tez ötüb keçmə

**transient** ['trænzɪənt] *adj* **1.** ötəri, keçici; tez keçən, davamsız; **2.** *amer.* müvəqqəti; **~ population** müvəqqəti əhali

**transit** ['trænzɪt, 'trænsɪt] *n* **1.** keçid, keçmə, keçirilmə; **rapid ~** iti keçid; **2.** tranzit; daşıma, daşınma; **damaged in ~** daşınmada xarab olmuş

**transit-duty** ['trænzɪt.dju:tɪ] *n* tranzit rüsumu

**transition** [træn'zɪʃn] *n* **1.** keçid; **a period of ~** keçid dövrü; **2.** yerdəyişmə, yeri dəyişdirilmə; **3.** *mus.* modulyasiya *(bir tondan başqasına keçmə)*

**transitional** [træn'zɪʃənl] *adj* keçici, aralıq, keçid; **a ~ stage** keçid mərhələ; **a ~ government** keçid/aralıq hökumət

**transitive** ['trænzıtıv] *adj qram.* təsirli; ~ **verbs** təsirli fellər

**transitory** ['trænzıtərı] *adj* ötəri, keçici, müvəqqəti

**translate** [træns'leıt] *v* **1.** tərcümə etmək; **to ~ word for word** sözbəsöz tərcümə etmək; **to ~ a book from Azerbaijani into English** Azərbaycan dilindən ingilis dilinə kitab tərcümə etmək; **2.** tərcümə olunmaq; *Poetry does not translate easily Poeziya asanlıqla tərcümə olunmur/edilmir; His book translates well Onun kitabı yaxşı tərcümə olunur;* **3.** izah/təfsir etmək, anlamaq; *This I translated as a protest Mən bunu etiraz kimi anladım;* **4.** *məc.* həyata keçirmək; yerinə yetirmək; **to ~ ideas/ schemes into actions** ideyaları/planları həyata keçirmək; **to ~ promises into actions** vədləri yerinə yetirmək

**translation** [træns'leıʃn] *n* **1.** tərcümə; çevirmə; **to read** *smth.* **in ~** bir şeyi tərcümədə oxumaq; *He is good at translation O, yaxşı tərcümə edir;* **2.** *rad.* translyasiya; **3.** yerdəyişmə, yeri dəyişdirilmə; **4.** irəliləyiş, irəli hərəkət

**translator** [træns'leıtə'] *n* tərcüməçi, mütərcim, tərcüman

**transliterate** [trænz'lıtəreıt] *v* transliterasiya etmək *(bir yazı sistemindəki hərfləri başqa yazı sistemi hərfləri ilə vermək)*

**transliteration** [.trænzlıtə'reıʃn] *n* transliterasiya

**translocate** [træns'loukeıt] *v* kənar etmək, çıxartmaq *(vəzifəsindən)*; yerini dəyişdirmək

**transmarine** [.trænsmə'ri:n] *adj* **1.** xarici, xarici ölkələrdən gətirilmiş; **2.** dəniz vasitəsilə yuyulan, dəniz suyunun yuduğu

**transmigrant** [trænz'maıgrənt] *n* bir rayondan /ölkədən başqasına köçən *(şəxs)*

**transmigrate** ['trænzmaı'greıt] *v* köçmək *(başqa yerə)*; köçürülmək

**transmigration** [.trænzmaı'greıʃn] *n* köçmə; köçürmə; köçürülmə, hicrət

**transmissable** [trænz'mısəbl] *adj* **1.** ötürülən, nəql edilə bilən; **2.** yoluxucu, yoluxan

**transmission** [trænz'mıʃn] *n* **1.** ötürmə, ötürülmə; **the ~ of news/disease** xəbər/xəstəlik ötürmə; **2.** transmissiya *(hərəkəti motordan maşınlara nəql edən val)*

**transmit** [trænz'mıt] *v* **1.** ötürmək, vermək, nəql etmək; **2.** göndərmək, yola salmaq; **3.** irsən keçmək/yoluxmaq

**transmitter** [trænz'mıtə'] *n* **1.** radioverici aparat; **2.** translyasiya stansiyası

**transmute** [trænz'mju:t] *v* çevirmək, döndərmək, ...şəklinə salmaq, ...halına salmaq

**transoceanic** ['trænz.ouʃı'ænık] *adj* okeanın o tayındakı/tayında olan

**transparency** [træns'peərənsı] *n* **1.** şəffaflıq; duruluq, təmizlik, saflıq; **2.** transparant; **3.** *amer.* diapozitiv

**transparent** [træns'peərənt] *adj* **1.** şəffaf; tərtəmiz, saf; **2.** aydın, aşkar, açıq-aşkar

**transpiration** [.trænspə'reıʃn] *n* **1.** tər, tər ifrazatı; **2.** buxarlanma, buğlanma

**transpire** [træns'paıə'] *v* **1.** aşkar olunmaq; **2.** *d.d.* baş vermək; **3.** buxarlanmaq

**transplant** [træns'pla:nt] *v* **1.** yerini dəyişdirmək, köçürmək; çıxarıb başqa yerə əkmək *(bitkini)*; **2.** köçürmək; **3.** *tib. sümüyün və ya toxumanın bir hissəsini kəsib başqa yerə tikmək və ya calamaq*

**transplantation** [.trænspla:n'teıʃn] *n* **1.** çıxarıb başqa yerə əkmə; **2.** *tib.* transplantasiya *(sümüyün, toxumanın bir hissəsini kəsib başqa yerə tikmə və ya calama)*

**transport**[1] [træns'pɔ:t] *n* **1.** nəqliyyat; nəqliyyat vasitələri; **2.** daşıma, daşınma

**transport**[2] [træns'pɔ:t] *v* daşımaq, gətirmək, aparmaq, köçürmək *(minikla)*

**transportable** [træns'pɔ:təbl] *adj* **1.** oynaq, hərəki, hərəkətli, mütəhərrik; **2.** səyyar, köçürülə /daşına bilən

**transportation** [.trænspɔ:'teıʃn] *n* **1.** daşıma, daşınma; *(nəqliyyat vasitələri ilə)*; **2.** *amer.* daşıma dəyəri/ qiyməti; **3.** *amer.* bilet *(dəmir yolunda, tramvayda)*

**transporter** [træns'pɔ:tə'] *n tex.* transportyor, konveyer

**transpose** [træns'pouz] *v* **1.** yerini dəyişdirmək, başqa yerə qoymaq, başqasının yerinə qoymaq; **2.** *mus.* bir tondan başqa tona keçirmək

**transposition** [.trænspə'zıʃn] *n* **1.** yerini dəyişdirmə, başqa yerə qoyma, başqasının yerinə qoyma; **2.** *mus.* bir tondan başqa tona keçirmə; **3.** gediş yerini dəyişdirmə *(şahmat oyununda)*

**trans-ship** [træns'ʃıp] *v* **1.** *dən.* bir gəmidən başqasına yükləmək; **2.** bir gəmidən düşüb başqasına minmək; minik dəyişdirmək

**trans-shipment** [træns'ʃıpmənt] *n* **1.** *dən.* bir gəmidən başqa yerə yükləmə; **2.** bir minikdən *(paroxoddan, vaqondan və s.)* düşüb başqasına minmə; minik dəyişdirmə

**transvalue** [trænz'vælju:] *v* həddindən artıq qiymətləndirmək, çox yüksək qiymət vermək/ qoymaq, qiymətini şişirtmək

**transverse** ['trænsvə:s] *adj* köndələninə/eninə qoyulan; köndələn; ~ **section** köndələn kəsik/oyma/ yarıq

**trap**[1] [træp] *n* **1.** tələ, duzaq; **to set a ~** tələ qurmaq; **to bait a ~, to fall into a ~** tələyə düşmək; **2.** *məc.* aldadıb tələyə/tora salmaq

**trap**[2] [træp] *v* **1.** tələ qurmaq; tələyə salmaq; **2.** aldadıb tora/tələyə salmaq; **3.** *tex.* tutmaq; udmaq, hopdurmaq

**trapdoor** ['træp'dɔ:] *n* lyuk, anbar ağzı, deşik

**trapeze** [træ'pi:z] *n riyaz.* trapesiya **(1)** *iki tərəfi paralel və digər iki tərəfi paralel olmayan dördbucaqlı cisim;* **2)** *iki ipdən asılmış ağacdan ibarət idman aləti)*

**trap-line** ['træplaın] *n* tələlər sistemi



**trapper** ['træpə'] *n* tələ quran ovçu, heyvan tutan ovçu *(tələ ilə)*

**trappy** ['træpı] *adj d.d.* xətərli, qorxulu, təhlükəli; xain, xaincəsinə, satqıncasına

**trap-shooting** ['træp.ʃu:tıŋ] *n id.* hərəkət edən hədəfə atma

**trash**[1] [træʃ] *n d.d.* **1.** pis ədəbi və ya bədii əsər; xaltura, başdansovma iş, bacarıqsız görülmüş iş; boş söz, cəfəngiyyat, boş şey; **2.** *amer.* tullantı, tör-töküntü, zir-zibil; **3.** *amer.* yararsız/bekara adam; yaramaz, alçaq, rəzil *(adam)*

**trash**[2] [træʃ] *v* **1.** zir-zibildən təmizləmək; **2.** ağacların ucunu vurmaq/kəsmək; **3.** şəkər qamışının yarpaqlarını təmizləmək; **4.** etinasızlıq/laqeydlik göstərmək

**trashy** ['træʃı] *adj* **1.** pis, xarab, yaramaz, aşağı keyfiyyətli; **2.** *amer.* vulqar, bayağı *(ədəbiyyat haq.)*

**trauma** ['trɔ:mə] *n (pl* **-ta** *və ya* **-s)** *tib.* **1.** travma; **2.** əsəbi travma

**traumata** ['trɔ:mətə] **trauma** *isminin cəm forması*

**traumatic** [trɔ:'mætık] *adj tib.* travmatik, travma

**traumatize, -ise** ['trɔ:mətaız] *v tib.* travmaya məruz qoymaq; əsəbləri sarsıtmaq, ruhi iztirab çəkdirmək/ vermək

**travail**[1] ['træveıl] *n* **1.** *d.d.* doğuş sancısı; **2.** gərgin əmək, ağır iş/zəhmət

**travail**[2] ['træveıl] *v* **1.** doğuş zamanı əziyyət çəkmək; **2.** çətin işi yerinə yetirmək

**travel**[1] ['trævl] *n* **1.** səyahət, səfər; **2.** səyahətnamə; **a book of ~** səyahət haqqında kitab; **3.** hərəkət, gediş-gəliş

**travel**[2] ['trævl] *adj* yol; **~ expenses** yol xərcləri; **~ notes** yol qeydləri

**travel**[3] ['trævl] *v* **(-ll-) 1.** səyahət etmək, səfərə çıxmaq; **to ~ abroad** xaricə getmək/səyahət etmək; **2.** hərəkət etmək, yayılmaq; *The news travelled fast Xəbər sürətlə yayıldı;* **3.** getmək; *The train was travelling 100 miles an hour Qatar saatda 100 mil sürətlə gedirdi;* **4.** gəzib dolanmaq; **to ~ round the world** dünyanı gəzib dolanmaq; **5.** baxmaq, nəzərdən/ gözdən keçirmək; *His eyes travelled over the picture O, şəkli gözdən/nəzərdən keçirdi*

**travel-bureau** ['trævl'bjuərou] *n* səyahətlər bürosu

**travel-film** ['trævlfılm] *n* səyahət haqqında film

**traveller** ['trævlə'] *n* **1.** səyyah, səyahətçi; **~'s cheque** yol qəbzi, turist talonu; **~ tales** ağ yalan, uydurma, "ovçu nağılları; **2.** *tex.* yüngül araba; **3.** ticarət agenti

**travelling**[1] ['trævlıŋ] *n* səyahət, səfər

**travelling**[2] ['trævlıŋ] *adj* **1.** səyahət/səfər edən, səyahətə/səfərə çıxan; səyyar; **a ~ kitchen** səyyar mətbəx *(hərbdə)*; **a ~ library** səyyar kitabxana; **~ exhibition** səyyar sərgi; **2.** yol; **~ clothes** yol paltarı

**travelling**[3] ['trævlıŋ] **to travel** *felinin pr. p forması*

**travelling-bag** ['trævlıŋbæg] *n* neseser *(tualet şeyləri olan yol çantası)*, sakvoyaj *(yol çantası)*

**travelling crane** ['trævlıŋkreın] *n* körpü kranı

**traverse**[1] ['trævə:s] *n* **1.** köndələn atılan tir; **2.** travers, bənd

**traverse**[2] ['trævə:s] *adj* köndələn, köndələn/eninə qoyulan

**traverse**[3] ['trævə:s] *v* **1.** kəsmək, iki bölmək; kəsib keçmək; **2.** *hüq.* etiraz /imtina etmək

**travesty**[1] ['trævıstı] *n* **1.** parodiya *(bir əsərin gülməli təqlidi)*, istehza; **2.** karikatura

**travesty**[2] ['trævıstı] *v* gülməli şəkildə yamsılamaq/ təqlid etmək; ələ salmaq

**trawl**[1] [trɔ:l] *n* tral, balıq toru

**trawl**[2] [trɔ:l] *v* tral ilə balıq tutmaq

**trawler** ['trɔ:lə'] *n* balıqçı gəmisi, tralla təchiz edilmiş balıqçı gəmisi

**tray** [treı] *n* **1.** podnos, məcməyi, sini; **to serve breakfast/ dinner on a ~** podnosda səhər yeməyi/ nahar gətirmək/vermək; **2.** xırdavatçı dükanı; **3.** *tex.* altlıq

**treacherous** ['tretʃərəs] *adj* **1.** xain, satqın, məkrli, hiyləgər; **~ glance/smile** hiyləgər baxış/təbəssüm; **2.** xəyanətkar, əhdi pozan, namərd; **3.** aldadıcı, etibarsız; dəyişkən; **~ ice/ branch** etibarsız buz/budaq; **~ weather** dəyişkən hava; **4.** sürüşkən, qorxulu; **~ path** sürüşkən cığır/ yol; **~ ice** sürüşkən buz

**treacherously** ['tretʃərəslı] *adv* xaincəsinə, satqıncasına, hiyləgərcəsinə, məkrlə, namərdəsinə

**treachery** ['tretʃərı] *n* xəyanət, xainlik, satqınlıq, namərdlik, məkr, hiyləgərlik

**tread**[1] [tred] *n* **1.** yeriş; **2.** cütləşdirmə; cütləşmə *(quşlar haq.)*; **3.** pillə; **4.** *tex.* diyirlətmə, diyirlənmə, yuvarlatma, yuvarlanma

**tread**[2] [tred] *v* **1.** addım atmaq, ayaq qoymaq/basmaq; **to ~ in** *smb.***'s steps** bir kəsin yolu ilə getmək; **to ~ lightly** ehtiyatla yerimək, asan addımlamaq; **2. (on, upon, down)** tapdalamaq, ayaqlamaq; ayaqlayıb əzmək, sıxmaq; **to ~ grapes** üzüm sıxmaq/əzmək; **to ~ under foot** ayaq altında məhv etmək/ tapdalamaq, ayaq altına salmaq; **3.** tapdalamaq; salmaq *(yol)*

**treadle** ['tredl] *n tex.* pedal *(ayaq lingi)*

**treadmill** ['tredmıl] *n tex.* ötürücü *(fırlanma hərəkətini bir yerdən o biri yerə ötürən mexanizm)*

**treason** ['tri:zn] *n* xəyanət, xəyanətkarlıq; satqınlıq; *It is treason to sell military information to a foreign power Hərbi informasiyanı xarici ölkəyə satmaq xəyanətkarlıqdır;* **high ~** vətənə xəyanət

**treasonable** ['tri:znəbl] *adj* xain, xəyanətkar, xaincəsinə; satqın, satqıncasına

**treasonous** ['tri:znəs] *adj* = **treasonable**

**treasure**[1] ['treʒə'] *n* daş-qaş, cavahirat, sərvət, dəfinə, xəzinə; **buried ~** basdırılmış xəzinə/dəfinə

**treasure**[2] ['treʒə'] *v* **1.** saxlamaq; mühafizə etmək; daş-qaş kimi saxlamaq; **2.** əziz tutmaq

çox qiymətləndirmək; qədrini bilmək; əsirgəmək; *She treasures their friendship O, dostluqlarını çox əziz tutur; I shall always treasure the memory of today Mən bu günün xatirəsini həmişə əziz tutacam*

**treasure-house** ['treʒəhaus] *n* xəzinə *(həm də məc.)*

**treasurer** ['treʒərəʳ] *n* **1.** xəzinədar, xəzinəçi; **Lord High Treasurer** *tar.* Dövlət xəzinədarı; **2.** saxlayan/ mühafizə edən/qoruyan adam *(dəyərləri, qiymətli şeyləri, kolleksiyaları və s.)*

**treasury** ['treʒərı] *n* **1.** xəzinə; **2. the Treasury** Dövlət xəzinəsi; maliyyə nazirliyi; **3.** *amer.* **Secretary of the Treasury** Maliyyə Naziri; **4.** dövlət, əmlak; pul

**treat¹** [tri:t] *n* **1.** ləzzət, kef, səfa, nəşə; *Seeing him was a real treat Onu görmək əsl nəşə idi; It was a treat to hear the children sing Uşaqların oxuduğu mahnını dinləmək ləzzət verdi;* **2.** qonaq etmə, qonaqlıq; *This is to be my treat, It's my treat, The treat is on me Bu qonaqlıq mənim hesabımadır, Qonaqlığı bu gün mən verirəm;* **to stand ~** qonaq etmək; **3.** piknik; səyahət, gəzinti, tənəzzöh; **4.** *d.d.* həzz, məmnunluq; *I want to give them a treat Mən onlara həzz bəxş etmək istəyirəm; The roses are looking a treat Güllər adama həzz verir*

**treat²** [tri:t] *v* **1.** rəftar etmək, davranmaq; yanaşmaq, münasibət göstərmək; **to ~ *smb.* badly /kindly** bir kəslə pis/yaxşı rəftar etmək; *He treated my words as a joke O mənim sözlərimə zarafat kimi yanaşdı;* **to ~ *smb.* with kindness** bir kəsə mehriban münasibət göstərmək; *They treated the girl like a child Onlar qızla uşaq kimi rəftar etdilər;* **to ~ someone as an equal** bir kəslə öz tay-tuşu kimi rəftar etmək; *We were treated with respect Bizə hörmətlə yanaşdılar; Don't treat this matter lightly Bu məsələyə yüngül yanaşma /yanaşmayın;* **2.** emal etmək; **to ~ with acid** turşu ilə emal etmək; **3.** əlavə etmək, qarışdırmaq; *The water is treated with chlorine Suya xlor əlavə edilir;* **4.** müalicə etmək; **to ~ *smb.* for a cold with a newly manufactured drug** bir kəsi soyuqdəymədən təzə istehsal olunmuş dərmanla müalicə etmək; **5.** şərh/izah etmək; bəhs etmək; *The book treats of poetry Bu kitabda poeziyadan bəhs edilir;* **6.** dəvət etmək *(teatra, kinoya və s.); My aunt and uncle treated us to the movies Xalam və dayım bizi kinoya dəvət etdilər;* **7.** qonaq etmək; **to ~ *smb.* to an ice-cream** bir kəsi dondurmaya qonaq etmək; **8.** danışıq aparmaq; əlaqəsi/işi olmaq; **to ~ for peace with the enemy** düşmənlə sülh danışıqları aparmaq; **9.** *geol.* zənginləşdirmək *(filizi, mineralı)*

**treatise** ['tri:tıs] *n* elmi əsər; **to write a ~** elmi əsər yazmaq

**treatment** ['tri:tmənt] *n* **1.** rəftar; münasibət; *I received preferential treatment Mənə hörmətli qonaq kimi münasibət göstərdilər;* **objective ~ of the subject** məsələyə obyektiv münasibət; **2.** *tex.* emal, emal etmə; **a method of ~ with acid** turşu ilə emal etmə üsulu; **3.** *tib.* müalicə, qulluq; **to take ~s** müalicə kürsu keçmək, müalicə olunmaq; **a new ~ for rheumatism** revmatizmin yeni müalicə üsulu; *He received medical treatment O, tibbi müalicə aldı;* **to undergo ~ for asthma** astma xəstəliyindən müalicə olunmaq; **4.** hopdurma, canına çəkdirmə; **5.** zənginləşmə *(filiz, mineral və s. haq.)*; **6.** izah, şərh

**treaty** ['tri:tı] *n* müqavilə, saziş; **peace ~, ~ of peace** sülh müqaviləsi/sazişi; **~ of friendship** dostluq müqaviləsi/sazişi; **to enter into ~** müqavilə/ saziş bağlamaq; **to observe a ~** müqaviləyə /sazişə riayət etmək; **to renounce a ~** müqavilədən/ sazişdən imtina etmək

**treble¹** ['trebl] *n* **1.** üç qat *(keyfiyyət)*; **2.** *mus.* zil səs, soprano

**treble²** ['trebl] *adj* **1.** üçqat, üçqat artıq; **2.** yüksək tonlu, zil *(səs haq.)*

**treble³** ['trebl] *v* **1.** üç dəfə artmaq, üçqat artırılmaq; **2.** zil səslə oxumaq

**tree¹** [tri:] *n* **1.** ağac; **green ~s** yaşıl ağaclar; **to climb a ~** ağaca çıxmaq/dırmaşmaq; **2.** şəcərə, nəsil ağacı; **a family ~** nəsil şəcərəsi; **3.** dar ağacı; **4.** ayaqqabı qəlibi; **5.** *tex.* dayaq, dirək, tir; **6.** *tex.* val; ox, mehvər;

◊ **to be at the top of the ~** əhəmiyyətli yer tutmaq; **up a ~** *d.d.* çıxılmaz vəziyyətdə

**tree²** [tri:] *v* **1.** ağaca dırmaşdırmaq; *The dog treed the cat İt pişiyi ağaca dırmaşdırdı;* **2.** ağaca çıxmaq/dırmaşmaq; *The hunter had to tree for his life Həyatını xilas etmək üçün ovçu ağaca dırmaşmalı oldu;* **3.** qəlibə salmaq *(ayaqqabını)*

**tree-creeper** ['tri:,kri:pəʳ] *n* ağacdələn

**tree-fern** ['tri:'fə:n] *n* qıjı

**tree-frog** ['tri:'frɔg] *n zool.* ağac qurbağası

**treeless** ['tri:lıs] *adj* ağacsız, çılpaq, meşəliyi az olan; **a ~ plain** ağacsız/çılpaq düzəngah /düzənlik

**tree-lined** ['tri:laınd] *adj* ağaclarla əhatələnmiş, kənarında ağac əkilmiş; **a ~ avenue/road** ağaclarla əhatələnmiş/ kənarlarında ağaclar əkilmiş xiyaban/ yol

**trefoil** ['trefɔıl] *n* **1.** yonca; **2.** üçyarpaqlı bəzəkli bitki

**trellis¹** ['trelıs] *n* **1.** barmaqlıq; **2.** bitkilərin sarmaşması və ya müəyyən şəkildə durması üçün xüsusi sipər və ya barmaqlıq; məhəccər; **3.** dayaq *(meyvə ağaclarına vurulan)*

**trellis²** ['trelıs] *v* **1.** dayaq vurmaq *(meyvə ağaclarına)*; **2.** tor düzəltmək *(sarmaşan bitkilər üçün)*; torla örtmək/bağlamaq

**tremble¹** ['trembl] *n* titrəmə, əsmə, titrəyiş; **all in a ~** cana lərzə/qorxu düşmə; *There was a tremble in her voice Onun səsində bir titrəmə/titrəyiş vardı*

**tremble²** ['trembl] *v* **1.** əsmək, titrəmək; **to ~ with anger/fear/cold** hirsdən/qorxudan/soyuqdan əsmək /titrəmək; *Her voice trembled with excitement Həyəcandan onun səsi titrədi;* **2.** qorxmaq, ehtiyat etmək; lərzəyə gətirmək/salmaq /düşmək; *I tremble to think what he might have done Onun nə edə biləcəyini fikirləşəndə mən lərzəyə düşürəm;* **3.** yellənmək, dalğalanmaq



**trembling¹** ['tremblıŋ] *n* **1.** titrəmə, əsmə; **2.** qorxu, lərzə; **in fear and ~** qorxu və lərzə içində

**trembling²** ['tremblıŋ] *adj* əsən, titrəyən, titrək; **a ~ voice** titrəyən səs; **in a ~ voice** titrək səslə

**trembly** ['tremblı] *adj* **1.** titrək, titrəyən; **2.** kələ-kötür, əyri-üyrü *(yazıda və s.)*; **3.** utancaq; qorxaq, ürəksiz, ağciyər

**tremendous** [trı'mendəs] *adj* **1.** qorxulu; dəhşətli; **~ events of the war** müharibənin dəhşətli hadisələri; **2.** çox böyük, iri; nəhəng; heyrətli; **a ~ house** çox böyük/iri ev

**tremendously** [trı'mendəslı] *adv* fövqəladə, olduqca, son/müstəsna dərəcədə; **~ pleased** çox/son dərəcə razı; *He is tremendously strong O, olduqca güclüdür*

**tremor** ['treməʳ] *n* **1.** əsmə; titrəyiş; *There was a tremor of excitement in his voice Onun səsində həyəcandan titrəyiş vardı;* **2.** titrətmə, silkələmə; təkan; **earthquake ~s** yeraltı təkanlar

**tremulous** ['tremjuləs] *adj* **1.** titrək, titrəyən; **a ~ voice** titrək səs; **2.** qorxaq; cəsarətsiz; həyəcanlı

**trench¹** [trentʃ] *n* **1.** xəndək, çuxur; qanov, oyuq, çala; **2.** *hərb.* səngər; **to open ~** səngər qazmaq

**trench²** [trentʃ] *v* **1.** qazmaq *(xəndək, səngər və s.)*; **2.** qazmaq, belləmək; **3.** oyuq açmaq; **4.** yarmaq; deşmək

◊ **to ~ upon 1)** qəsd etmək; toxunmaq; müdaxilə etmək; **to ~ upon *smb.'s* time** bir kəsin vaxtını almaq; **2)** bərabər olmaq, yaxın gəlmək; *His answer trenched upon insolence Onun cavabı ədəbsizliyə bərabər idi*

**trenchant** ['trentʃənt] *adj* **1.** iti, kəskin; **a ~ wit** iti zəka; **2.** sərt, kobud; toxunan *(söz və s.)*; **~ style** sərt üslub; **3.** aydın, dəqiq, müəyyən, aşkar; **~ policy** aydın siyasət; *She gave trenchant arguments O, aydın dəlillər gətirdi*

**trench-bomb** ['trentʃbɔm] *n hərb.* əl qumbarası

**trench coat** ['trentʃkout] *n hərb.* əsgər şineli

**trencher** ['trentʃəʳ] *n* **1.** əsgər; **2.** xəndək qazan əsgər; **3.** *tar.* böyük taxta təknə

**trenchercap** ['trentʃəkæp] *n* baş geyimi *(üst hissəsi dördkünc olan: İngiltərədə tələbə və professorların geyindiyi papaq)*

**trencherman** ['trentʃəmən] *n (pl* **-men** [-mən]) **1.** qarınqulu; **2.** müftəxor

**trench mortar** ['trentʃ'mɔ:təʳ] *n hərb.* minomyot, minaatan

**trend¹** [trend] *n* istiqamət; cərəyan; meyl, tendensiya; **new ~s in scientific thought** elmi fikirdə yeni cərəyanlar/ istiqamətlər; **the latest ~s in modern music** müasir musiqidə ən son cərəyanlar/ meyllər

**trend²** [trend] *v* **1.** sapdırılmaq; yönəlmək; *The road trends to the north Yol şimala /şimal istiqamətinə yönəlir;* **2.** meyl etmək, meyli olmaq

**trepidation** [,trepı'deıʃn] *n* **1.** əsmə, titrəmə, titrəyiş; **2.** həyəcan; narahatlıq; **fear and ~** qorxu və həyəcan

**trespass¹** ['trespəs] *n* **1.** qəsd, qəsd etmə; sui-istifadə; **2.** *hüq.* varisliyin pozulması; **3.** *hüq.* qanun pozuntusu; təqsir, suç, xəta; **4.** *din.* günah, günah işləmə/etmə

**trespass²** ['trespəs] *v* **1.** qəsd etmək; sui-istifadə etmək; **to ~ upon *smb.*'s hospitality** bir kəsin qonaqpərvərliyindən sui-istifadə etmək; **2.** varislik hüquqlarını pozmaq; **3.** qanun pozmaq; günah etmək; **4.** müdaxilə etmək, qarışmaq

**trespasser** ['trespəsəʳ] *n* **1.** başqasının mülkiyyətinə soxulan/girən adam; **2.** qanun pozan, cinayətkar

**tress** [tres] *n* **1.** uzun saç/tel; hörük; **2.** açıq buraxılmış saç, gərdənə tökülmüş saç

**tressed** [trest] *adj* **1.** hörüklü; **2.** hörülmüş *(saç haq.)*

**trestle** ['tresl] *n* **1.** estakada; **2.** *inş.* eşşək *(hündür skamya)*; taxtabənd, körpü *(fəhlələrin işləməsi üçün tikilən və ya təmir olunan uca binaların qabağında taxta-şalbandan və ya metaldan düzəldilən müvəqqəti qurğu)*

**trews** [tru:z] *n pl* dama-dama şalvar *(şotland dağlılarının geydikləri)*

**trey** [treı] *n* üçlük *(kart oyununda)*; üç xal *(kart oyununda)*

**triable** ['traıəbl] *adj* **1.** təcrübəyə yararlı; təcrübəyə cəlb oluna bilən; **2.** *hüq.* məhkəməyə aid

**triad** ['traıəd] *n* **1.** üç nəfərdən ibarət qrup, triada *(üçlük)*; **2.** *mus.* üç səsli

**triage** ['traııdʒ] *n* **1.** çeşidləmə, çeşidlərə/növlərə ayırma; **2.** aşağı növlü/keyfiyyətli qəhvə dəni

**trial¹** ['traıəl] *n* **1.** sınaq, təcrübə; **to give a ~** sınaqdan keçirmək; *He is on trial O, sınaq müddəti keçir;* **to learn by ~ and error** təcrübədən və səhvdən öyrənmək; **to be on ~** sınaq müddətində olmaq, təcrübə keçmək; *They took the car for a trial run Onlar maşını sınaqdan keçirməyə apardılar;* **2.** həyəcan, ağır sınaq; **the ~s of old age** qocalığın ağır sınaqları; **3.** *hüq.* məhkəmə; istintaq, işə baxma; **to bring to ~** məhkəməyə/ məhkəmə məsuliyyətinə cəlb etmək; **to be on *one's* ~, to stand/to undergo ~** işi məhkəmədə olmaq; *He will get a fair trial O, qanunla cəzalandırılacaq/ ittiham olunacaq;* **4.** təşəbbüs; sınaq, təcrübə; **5.** *geol.* kəşfiyyat, axtarış;

◊ *That child is a real trial to me Bu uşaq mənim başıma əsl bəladır*

**trial²** ['traıəl] *adj* sınaq, nümunə üçün, sınaq üçün edilən; **~ period** sınaq dövrü/müddəti; **~ shot** *hərb.* sınaq atəşi; **~ flight** sınaq uçuşu

**trial jury** ['traıəl'dʒu:ərı] *n hüq.* on iki iclasçıdan /vəkildən ibarət məhkəmə

**triangle** [ˈtraıæŋgl] *n* 1. üçbucaq; a **right-angled** ~ düzbucaqlı üçbucaq; 2. künyə *(çertyoj aləti)*
**triangular** [traıˈæŋgjulə] *adj* 1. üçbucaqlı; 2. üçüzlü, üçtərəfli; a ~ **pyramid** üçtərəfli/üçüzlü piramida; 3. üç nəfərin iştirakı ilə yaranan *(qrup, partiya və s.)*; ~ **agreement** üçtərəfli mü-qavilə
**triangulate** [traıˈæŋguleıt] *v* 1. tranqulyasiya aparmaq, dəqiq ölçmək *(sahəni, məsafəni, bucağı və s.)*; 2. *riyaz.* üçbucağı həll etmək; 3. üçbucaq formasına salmaq
**tribal** [ˈtraıbəl] *adj* tayfa, qəbilə; ~ **war** tayfa/qəbilə davası; ~ **languages** qəbilə/tayfa dilləri
**tribe** [traıb] *n* 1. tayfa, nəsil, qəbilə; **warring** ~s döyüşən qəbilələr; *I hate the whole tribe of them Mən onların bütün nəslinə nifrət edirəm*; 2. dəstə, qrup; ~ **of drunken hooligans** sərxoş xuliqan dəstələri/ qrupları
**tribesman** [ˈtraıbzmən] *n* (*pl* **-men** [-mən]) qəbilə üzvü; həmqəbilə, qohum
**tribulation** [ˌtrıbjuˈleıʃn] *n* dərd, kədər, qəm, qəm-qüssə; bədbəxtlik; **trials and** ~s keşmə-keşlər və bədbəxtliklər; *The poor have many tribulations Kasıbların çox dərdi olur*
**tribunal** [traıˈbju:nl] *n* 1. məhkəmə, tribunal; **the** ~ **of public opinion** ictimai rəy məhkəməsi; 2. hakim kürsüsü; 3. hərbi çağırışdan azad edən komissiya
**tribune** [ˈtrıbju:n] *n* tribuna, xitabət kürsüsü; natiq üçün hündür yer; kafedra
**tributary**[1] [ˈtrıbjutərı] *n* 1. bac/xərac verən; vergi verən dövlət; 2. qol *(çayda)*
**tributary**[2] [ˈtrıbjutərı] *adj* 1. vergi verən; tabelikdə olan, tabe edilən; 2. çay; ~ **stream** çay axını
**tribute** [ˈtrıbju:t] *n* 1. xərac, bac, vergi; **to lay under** ~ vergi qoymaq; 2. haqq; **to pay a** ~ **to** *smb.* bir kəsə haqqını /qiymətini vermək; 3. kollektiv vergi; hədiyyə, bəxşiş, mükafat; **floral** ~s çiçək hədiyyəsi; **as a** ~ **to her loyalty** onun sədaqətinə mükafat kimi
**trice**[1] [traıs] *n* an; **in a** ~ bir anda; dərhal
**trice**[2] [traıs] *v dən.* çəkmək, çəkib bağlamaq; bağlamaq, bənd etmək *(adət.* **to** ~ **up)**
**trichord** [ˈtraıkɔ:d] *n* üçsimli/üçtelli musiqi aləti
**trichotomy** [traıˈkɔtəmı] *n* üç hissəyə bölmə, üçyerə ayırma
**trichromatic** [ˌtraıkrouˈmætık] *adj* üçrəngli
**trick**[1] [trık] *n* 1. hiyləgərlik, biclik, yalan, kələk; **by** ~ hiyləgərliklə, bicliklə; *I suspect a trick Mənə elə gəlir ki, burada bir kələk var*; **to play** *smb.* **a** ~ bir kəsi aldatmaq, bir kəsə kələk gəlmək; *You shall not serve me that trick twice Sən/Siz o kələyi mənə ikinci dəfə gələ bilməzsən/bilməzsiniz*; 2. fokus, hoqqa, fırıldaq; məharət; *None of your tricks! Hoqqa çıxarma /çıxarmayın!*; **a dirty** ~ alçaqlıq, əclaflıq; **to do** ~s fokus göstərmək; 3. zarafat; dəcəllik, şuluqluq; yersiz/münasibətsiz hərəkət; **to play a** ~ **on** *smb.* bir kəslə zarafat etmək; bir kəsi ələ salmaq; *His memory played a trick on him Yaddaşı onu aldatdı*; **childish** ~s uşaq dəcəlliyi; **a clever** ~ ağıllı fənd; **to play a dirty** ~ **on** *smb.* bir kəsə qarşı alçaqlıq/pislik etmək; *He knows all the tricks O bütün fırıldaqları bilir*; 4. səriştə, təcrübə, vərdiş; *I don't know the trick of it Bunu necə etməkdə mənim səriştəm yoxdur*; **all the** ~s **and turns** bütün hiyləgərliklər və bicliklər; 5. xüsusiyyət, səciyyəvi cəhət *(sifət, səs)*; tərz, vərdiş *(əsas. pis vərdiş)*; **certain** ~s **of style** üslubun bəzi xüsusiyyətləri; *He has a trick of repeating himself Təkrarlamaq onun vərdişidir*; 6. vurulan kart *(qumar oyununda)*; **to take a** ~ vurulan kartı götürmək; 7. *dən.* növbə, əvəz etmə *(sükanda)*; **to take/to have/ to stand** *one's* ~ növbə çəkmək, növbədə durmaq; 8. *amer.* bəzək-düzək, oyun-oyuncaq; 9. *amer. d.d.* uşaq, körpə; **a little/pretty** ~ balaca/ qəşəng körpə; ◊ **to do the** ~ məqsədə nail olmaq/çatmaq; *This medicine should do the trick Bu dərman mütləq təsir etməlidir*
**trick**[2] [trık] *v* 1. aldatmaq, kələk gəlmək; dilə tutmaq, tovlamaq; *We were tricked Bizə kələk gəldilər, Bizi aldatdılar; The man tricked her out of the money Kişi onu tovlayıb pulunu əlindən aldı*; 2. pis vəziyyətdə qoymaq; **to** ~ **out/up** məharətlə/ustalıqla bəzəmək
**trickery** [ˈtrıkərı] *n* 1. aldatma, kələk gəlmə; 2. hiyləgərlik, fırıldaq
**trickle**[1] [ˈtrıkl] *n* şırnaq, xəfif axın, cərəyan; **a** ~ **of blood/water** qan/su axını
**trickle**[2] [ˈtrıkl] *v* 1. nazik şırnaqla axmaq, süzülmək, axmaq *(həm də* **to** ~ **out /down /through /along)** damcılamaq; *Blood trickled from the wound Yaradan qan damcıladı; The news trickled out Xəbər yayıldı*; 2. tökülmək, süzülmək; *Tears trickled down her cheeks Göz yaşları onun yanaqlarından töküldü/süzüldü*
**trickster** [ˈtrıkstəʳ] *n* 1. yalançı, adamaldadan; zirək/ diribaş adam; 2. *amer.* hiyləgər, bic, haramzadə, fırıldaqçı *(adam)*
**tricksy** [ˈtrıksı] *adj* 1. nadinc, dəcəl; 2. etibarsız, saxta; 3. *d.d.* şıq geyinmiş, bəzənib-düzənmiş, geyinib-kecinmiş
**tricky** [ˈtrıkı] *adj* 1. bic, hiyləgər, fəndgir; hazırcavab, məharətli; **a** ~ **politician** bic/hiyləgər siyasətçi; 2. mürəkkəb; qəribə, anlaşılmaz; **a** ~ **situation** mürəkkəb vəziyyət; **a** ~ **problem in mathematics** riyaziyyatda mürəkkəb məsələ; ~ **argument** anlaşılmaz dəlil; 3. etibarsız, etibar edilə bilməyən; **a** ~ **brake** etibarsız əyləc/ tormoz
**tricolour**[1] [ˈtrıkələʳ] *n* üçrəngli bayraq; **the Azerbaijan/ France** ~ Azərbaycanın/Fransanın üçrəngli bayrağı
**tricolour**[2] [ˈtrıkələʳ] *adj* üçrəng; **a** ~ **flag** üçrəng bayraq
**tricot** [ˈtrıkou] *n fr.* 1. triko *(yun parça)*; 2. trikotaj, trikotaj məmulatı



**tricycle**[1] [ˈtraısıkl] *n* 1. üççarxlı/üçtəkərli velosiped; 2. arabalı/beşikli motosikl
**tricycle**[2] [ˈtraısıkl] *v* üççarxlı velosiped/motosikl sürmək
**trident** [ˈtraıdənt] *n* üçbaşlı əsa
**tried** [traıd] *adj* sınanmış, yoxlanmış, sınaqdan çıxarılmış; etibarlı, sədaqətli; *He is a friend, tried and true O, sınanmış və sədaqətli dostdur*
**triennial**[1] [traıˈenjəl] *n* 1. üç ildən bir təkrar olunan hadisə; 2. üçillik proses/müddət və s.; 3. üçillik ildönümü; 4. üçillik bitki
**triennial**[2] [traıˈenjəl] *adj* 1. üçillik, üç il davam edən; 2. hər üç ildən bir təkrar olunan
**trifle**[1] [ˈtraıfl] *n* 1. boş/əhəmiyyətsiz/cüzi/mənasız şey; **a** ~ bir qədər, yüngülcə; *Don't waste time on trifles Boş/mənasız şeylərlə vaxtını/vaxtınızı itirmə/ itirməyin; He is upset by every trifle O hər cür boş şeydən dilxor olur; He seems a trifle annoyed O bir qədər hirsli görünür*; 2. az, az miqdarda, cüzi məbləğdə; *It costs a trifle Bu, baha deyil; Put a trifle of sugar in my tea Mənim çayıma bir az qənd sal/salın; $ 100 is a mere trifle for him 100 dollar onun üçün boş şeydir/bir pul deyil*
**trifle**[2] [ˈtraıfl] *v* 1. zarafat etmək, zarafatlaşmaq, hənəkləşmək; ələ salmaq, masqaraya qoymaq; *He is not a man to trifle with Onunla zarafat etmək olmaz; Onunla zarafatın axırı pis olar*; 2. özünü yüngül aparmaq; boş şeylərlə məşğul olmaq; *He trifles time away O, vaxtını boş şeylərə sərf edir/boş şeylərlə keçirir*; 3. oynamaq, oynatmaq, fırlatmaq; *Don't trifle with your food Xörəyinlə/Xörəyinizlə oynama /oynamayın*; **to** ~ **with** *smb.'s* **affections** bir kəsin hissləri ilə oynamaq
**trifling**[1] [ˈtraıflıŋ] *n* 1. sataşma, lağa qoyma, ələ salma; lağlağı, yüngül söhbət; 2. vaxt itkisi, vaxt itirmə
**trifling**[2] [ˈtraıflıŋ] *adj* 1. boş, mənasız, cəfəng; **a** ~ **talk** boş/mənasız söhbət; 2. cüzi, bekara, heç bir şeyə yaramayan, yersiz, yaramaz; **a** ~ **joke** yersiz zarafat; **a** ~ **amount** cüzi məbləğ
**triform** [ˈtraıfɔ:m] *adj* üçformalı, üçşəkilli
**trig**[1] [trıg] *adj* 1. səliqəli, təmizkar, təmiz; 2. möhkəm, sağlam; 3. tərtibli, müntəzəm; dürüst
**trig**[2] [trıg] *v* 1. səliqəli saxlamaq *(həm də* **to** ~ **up)**; 2. bəzəmək, geyindirmək, geyindirib-kecindirmək; 3. doldurmaq, tıxamaq; 4. *tex.* tormozlamaq, dayandırmaq; pazlamaq, paz vurmaq
**trigger**[1] [ˈtrıgəʳ] *n* 1. *hərb.* tətik; **to pull the** ~ tətiyi çəkmək; 2. *mac.* işə salma
**trigger**[2] [ˈtrıgəʳ] *v* 1. səbəb/bais olmaq; törətmək, oyatmaq, doğurmaq; *It triggered off a storm of protest Bu, etiraz dalğasına səbəb oldu*; 2. işə salmaq, hərəkətə gətirmək; başlamaq
**trigger-happy** [ˈtrıgəˌhæpı] *adj* 1. *d.d.* silahla ağılsız/ düşüncəsiz davranan; **to be** ~ hədəfi ayırd /müəyyən etmədən atmaq/atəş açmaq; 2. davakar, təcavüzkar
**trigonometric** [ˌtrıgənəˈmetrık] *adj riyaz.* triqonometrik
**trigonometrical** [ˌtrıgənəˈmetrıkəl] *adj* = **trigonometric**
**trigonometry** [ˌtrıgəˈnɔmıtrı] *n riyaz.* triqonometriya
**trigonous** [ˈtrıgənəs] *adj* üçbucaqlı, üçkünc
**trihedral** [traıˈhi:drəl] *adj riyaz.* üçüzlü
**trihedron** [traıˈhi:drən] *n riyaz.* üçüzlü *(cisim)*
**trilateral** [ˈtraıˈlætərəl] *adj* üçtərəfli; üçyanlı
**trilby** [ˈtrılbı] *n* yumşaq keçə şlyapa
**trilingual** [ˈtraıˈlıŋgwəl] *adj* 1. üçdilli; 2. üç dildə danışan
**trill**[1] [trıl] *n* 1. *mus.* trel; 2. *dilç.* titrək səs
**trill**[2] [trıl] *v* 1. *mus.* cəh-cəh/zəngulə vurmaq; *The canary is trilling in the cage Sarıbülbül qəfəsdə cəh-cəh vurur*; 2. titrək səs tələffüz etmək
**trilling** [ˈtrılıŋ] *n* üçəm, üç ekiz uşaq
**trillion** [ˈtrıljən] *n* 1. kvintilyon *(min kvadrilyona bərabər ədəd)*; 2. *amer.* trillion
**trilogy** [ˈtrılədʒı] *n* trilogiya *(bir müəllifin məzmunu bir-birilə əlaqədar olan üç əsəri)*
**trim**[1] [trım] *n* 1. nizam, intizam; 2. hazırlıq, amadəlik, hazır olma; **in fighting** ~ döyüşə hazır vəziyyətdə olma; **to be in good** ~ yaxşı formada olmaq *(idmançı haq.)*; 3. geyim, paltar; bəzək-düzək, zinət; naxış, bəzək, haşiyə; 4. *amer.* vitrin bəzəyi; 5. kəsib qısaltma/gödəltmə; vurma, vurulma, qayçılama *(saçı)*; *Her hair needs a trim O, saçını kəsdirməlidir/ vurdurmalıdır*; **to give someone a** ~ kimsənin saçını qısaltmaq; 6. *tex.* daxili bəzək; 7. *dən.* ballastın düzgün yerləşdirilməsi
**trim**[2] [trım] *adj* 1. səliqəli, təmizkar, təmiz; qaydaya salınmış; 2. gözəl geyinmiş, bəzənib-düzənmiş; qəşəng, zərif; 3. *d.d.* hazır vəziyyətdə
**trim**[3] [trım] *v* 1. səliqəyə/sahmana salmaq; **to** ~ **oneself** özünü səliqəyə salmaq; 2. kəsmək, qayçılamaq, kəsib gödəltmək, vurmaq; **to** ~ **dead branches off a tree** ağacın quru budaqlarını kəsmək; 3. bəzəmək, bəzək vurmaq *(paltara)*; 4. barışdırmaq; 5. *d.d.* aldatmaq, kələk gəlmək; 6. *dən.* tarazlaşdırmaq, müvazinətləndirmək, müvazinətə gətirmək *(gəmini)*
**trimester** [traıˈmestəʳ] *n* 1. rüb, üç ay; 2. üçaylıq müddət
**trimmer** [ˈtrıməʳ] *n* 1. nizamlayıcı, qaydaya/nizama salan; 2. ikiüzlü; hər bir şəraitə uyğunlaşan adam; 3. *dən.* yükün yığılması/yerləşdirilməsi
**trimming** [ˈtrımıŋ] *n* 1. haşiyə, bəzək, naxış *(paltarda)*; 2. *d.d.* qarnir *(xörəyə əlavə olunan bişmiş səbzəvat)*, xuruş; 3. *d.d.* vurma, döymə; kötək; 4. ədviyyat, aşqar; 5. doldurma *(lampanı və s.)*
**trine** [traın] *adj* 1. üçqat, üçqat artıq, üç dəfə böyük, üç misli; 2. əlverişli, münasib, yararlı
**Trinitarian** [ˌtrınıˈteərıən] *n din.* üçlük ehkamına inanan
**trinket** [ˈtrıŋkıt] *n* 1. bəzək-düzək, oyun-oyuncaq; brelok; 2. boş /əhəmiyyətsiz şey

**trinomial**[1] ['traɪ'noumjəl] *n riyaz.* üçhədli
**trinomial**[2] ['traɪ'noumjəl] *adj* **1.** *riyaz.* üçhədli; **2.** *biol.* trinominal
**trio** ['tri:ou] *n* **1.** *mus.* trio, üçlük *(üç səs və ya alət üçün yazılmış musiqi əsəri)*; **2.** trio *(musiqi əsərini ifa edən üç çalğıçı və ya üç müğənni)*
**triolet** ['trioulet] *n ədəb.* triolet *(səkkizmisralı şer)*
**trip**[1] [trɪp] *n* **1.** səyahət, səfər *(qısa)*; **a round ~** ikitərəfli səfər; **a business ~** işgüzar səfər; **to take a ~** getmək, dəyib qayıtmaq *(minikla)*; **a ~ to the seaside/ abroad** dəniz kənarına/xaricə səfər; **2.** asta yeriş, yüngül addım; **3.** büdrəmə, ayağı dolaşma/ ilişmə; ilişib yıxılma; **4.** səhv/yanlış addım; **5.** *id.* badalaq
**trip**[2] [trɪp] *v* **(-pp-) 1.** yerimək, tez-tez və asan yerimək; *She tripped happily about the room O, otaqda bəxtəvərcəsinə gəzişdi*; **2.** büdrəmək, ayağı dolaşmaq, ilişib yıxılmaq *(həm də* **to ~ on/over/up***)*; *He tripped over a stone O, daşa ilişib büdrədi*; **3.** səhv etmək, yanlış addım atmaq; *All are apt to trip Hər bir kəs səhv edə bilər; She tripped on the spelling of "rhythm" O, "rhythm" sözünün yazılışında səhv etdi*; **4.** badalaq vurmaq/gəlmək; *Bill put out his foot and tripped me Bill ayağını uzadaraq mənə badalaq vurdu*; **5.** dolaşdırmaq, çaşdırmaq, karıxdırmaq; *That question tripped us all O sual bizim hamımızı çaşdırdı*; **to ~ up a witness by artful questions** dolaşıq suallarla şahidi çaşdırmaq; **6.** üstünü açmaq, ifşa etmək, tutmaq *(cinayət başında)*; **7.** *arx.* səfərə çıxmaq, səyahətə/ ekskursiyaya getmək; **8.** *tex.* ayırmaq, aralamaq *(vaqonu və s.)*; **9.** *dən.* burub/ qazıb çıxartmaq, döndərmək, süxurdan burub çıxartmaq *(lövbəri və s.)*
**tripartite** ['traɪ'pa:taɪt] *adj* **1.** üç hissədən/vahiddən ibarət olan, üçtərəfli; **a ~ conference** üç dövlətin konfransı; **2.** üçlük
**tripe** [traɪp] *n* **1.** heyvan qarnından bişirilən yemək; **2.** *sl* cəfəngiyyat, axmaq söz
**trip-hammer** ['trɪp,hæmə<sup>r</sup>] *n tex.* düşən gürz, böyük çəkic
**triphibious** [traɪ'fɪbɪəs] *adj* yerdə, dənizdə və havada baş verən; **~ warfare** quruda, suda və havada aparılan müharibə
**triphthong** ['trɪfθoŋ] *n dilç.* triftonq *(üç saitin bir hecada birləşməsi)*
**triple**[1] ['trɪpl] *adj* **1.** üçqat, üçqat artıq, üç dəfə böyük; **2.** üç hissədən ibarət olan, üçlük; **Triple Alliance** Üçlər İttifaqı, üç dövlətin ittifaqı
**triple**[2] ['trɪpl] *v* üç dəfə/üçqat artırılmaq, üç dəfə/üçqat artırmaq
**triplet** ['trɪplɪt] *n* **1.** üçlük; **2.** yan-yana qoyulmuş üç qat; **3.** üçəm, üç ekiz uşaq; **4.** *mus.* triol *(üç bərabər notdan ibarət ritmik fiqur)*; **5.** üç nəfərlik
**triplex** ['trɪpleks] *adj* **1.** üçqat, üçqat artıq, üç dəfə böyük; üç hissədən ibarət olan; **2.** üçtərəfli; **3.** *tex.* tikilmiş, bina edilmiş
**triplicate**[1] ['trɪplɪkeɪt] *n* üç nüsxədən biri; **in ~** üç nüsxədə
**triplicate**[2] ['trɪplɪkɪt] *adj* üçqat, üçqat artıq, üç dəfə böyük; üç hissədən ibarət olan
**triplicate**[3] ['trɪplɪkeɪt] *v* üç dəfə/üçqat artırmaq; üç nüsxədə tərtib etmək
**triplication** [,trɪplɪ'keɪʃn] *n* üç dəfə/üçqat artırma
**tripod**[1] ['traɪpɔd] *n* **1.** üçayaq, sacayaq; ştativ, altlıq; **2.** üçayaqlı stol/stul; üçayaqlı miz/masa/kürsü
**tripod**[2] ['traɪpɔd] *adj* üçayaqlı, üçqıçlı
**tripos** ['traɪpɔs] *n* imtahan, əla qiymət almaq üçün imtahan *(Kembricdə)*
**tripper** ['trɪpə<sup>r</sup>] *n* ekskursant, ekskursiyaçı *(ekskursiya iştirakçısı)*, turist
**triquetrous** [traɪ'kwetrəs] *adj* **1.** üçbucaqlı, üçüzlü; **2.** *bot.* üçgül
**trisect** [traɪ'sekt] *v* üç bərabər hissəyə bölmək
**trisyllabic** ['traɪsɪ'læbɪk] *adj* üçhecalı; **a ~ word** üçhecalı söz
**trisyllable** ['traɪ'sɪləbl] *n* üçhecalı söz
**trite** [traɪt] *adj* mənasız, çürük, boş, bayağı, çeynənmiş; **a ~ phrase** çeynənmiş ifadə; **a ~ metaphor** çeynənmiş/köhnə metafora/məcaz
**triumph**[1] ['traɪəmf] *n* **1.** triumf, təntənə; *She grinned in triumph when she won the race Qalib gəldikdə o, təntənə ilə gülümsündü*; **2.** qələbə, zəfər, qalibiyyət; **a shout of ~** zəfər/qələbə qışqırığı; *His triumph over illness inspired us Onun xəstəlik üzərində qələbəsi bizi ruhlandırdı*
**triumph**[2] ['traɪəmf] *v* **1.** bayram etmək/keçirtmək; şadlıq/şənlik etmək, şadlanmaq, sevinmək; **2.** qalib/üstün gəlmək, qələbə çalmaq, udmaq, basmaq; **to ~ over an enemy** düşmənə qalib gəlmək, düşmən üzərində qələbə çalmaq
**triumphal** [traɪ'ʌmfəl] *adj* zəfər; təntənə; **~ procession/ arch** zəfər nümayişi/tağı
**triumphant** [traɪ'ʌmfənt] *adj* **1.** qalibiyyətli, müzəffər; yenilməz, basılmaz; **the ~ army** müzəffər /yenilməz ordu; **2.** şən, qələbə/zəfər çalan; şadlıq/ şadyanalıq edən; *We heard their triumphant laughter Biz onların şən gülüşünü eşitdik*
**trivet**[1] ['trɪvɪt] *n* **1.** sacayaq; **2.** altlıq *(tava, çaynik və s. üçün)*
**trivet**[2] ['trɪvɪt] *adj* üçayaqlı, üçqıçlı; **a ~ table** üçayaqlı masa/stol
**trivia** ['trɪvɪə] *n lat. pl* əhəmiyyətsiz/mənasız/boş şey
**trivial** ['trɪvɪəl] *adj* **1.** yüngül, adi, gündəlik; boş, bayağı; **~ injury** yüngül zədə; **~ matters** boş şeylər; **~ loss** xırda itki; **2.** cüzi, əhəmiyyətsiz, mənasız, xırda; **a ~ loss** cüzi itki; *She owes me a trivial sum Onun mənə cüzi məbləğdə borcu var*; **3.** məhdudlaşdırılmış, qısalmış, azaldılmış; **4.** qeyri-elmi, elmə zidd *(bitki və heyvan adları haq.)*
**triviality** [,trɪvɪ'ælɪtɪ] *n* **1.** bayağılıq, adilik, məzmunsuzluq; **2.** azlıq, cüzilik; əhəmiyyətsizlik



**triweekly**[1] [traɪ'wi:klɪ] *n* hər üç həftədən bir çıxan periodik nəşr
**triweekly**[2] [traɪ'wi:klɪ] *adj* **1.** hər üç həftədən bir baş verən; **2.** həftədə üç dəfə çıxan
**trod** [trɔd] **to tread** *felinin pt forması*
**trodden** ['trɔdn] **to tread** *felinin pp forması*
**Trojan**[1] ['troudʒən] *n* **1.** troyalı; **2.** güclü və zəhmətkeş /dözümlü adam;
◊ **to work like a ~** cidd-cəhdlə işləmək, səylə çalışmaq
**Trojan**[2] ['troudʒən] *adj* troya; **the ~ War** Troya müharibəsi
**troll**[1] [troul] *n* **1.** müğənnilərin/ xanəndələrin növbə ilə oxuduqları kuplet; **2.** balıq tutmaq üçün lövhəcik *(balıqcıq)*; **3.** troll *(skandinav əsatirində: div, qulyabanı, cin və s.)*
**troll**[2] [troul] *v* **1.** oxumaq, məşq etmək *(növbə ilə)*; **2.** balıq tutmaq *(balıqcıqla)*; **3.** diyirlətmək, gillətmək; diyirlənmək, gillənmək
**trolley** ['trɔlɪ] *n* **1.** əl arabası *(xörək paylamaq üçün)*; **2.** vaqonet *(kiçik vaqon)*; **3.** *amer.* tramvay
**trolley-bus** ['trɔlɪbʌs] *n* trolleybus
**trolley-car** ['trɔlɪka:<sup>r</sup>] *n amer.* tramvay
**trollop** ['trɔləp] *n* **1.** pinti, natəmiz; **2.** *d.d.* fahişə, qəhbə
**trombone** [trɔm'boun] *n mus.* trombon *(boru şəklində musiqi aləti)*
**trommel** ['trɔməl] *n* şeypur *(siqnal borusu)*
**tromometer** [trou'mɔmɪtə<sup>r</sup>] *n* mikro-seysmometr *(yer tərpənməsini müşahidə etmək üçün cihaz)*
**troop**[1] [tru:p] *n* **1.** dəstə, qrup; **a ~ of school-children** bir dəstə məktəb uşağı; **2.** *pl* qoşun, ordu; **foreign ~s** xarici qoşunlar; **3.** sürü, naxır; **4.** *amer. hərb.* eskadron *(piyada qoşunda rotaya bərabər süvari qoşun hissəsi)*; **5.** *hərb.* toplanma siqnalı
**troop**[2] [tru:p] *v* **1.** *(həm də* **to ~ up/together***)* yığılmaq, toplaşmaq; *The students trooped into the hall Tələbələr zala yığışdılar/toplaşdılar*; **2.** dəstə ilə hərəkət etmək; **3.** cərgə ilə/nizamla keçmək; **4.** sıraya düzülmək; **to ~ away** tələsik yola düşmək; uzaqlaşmaq; **to ~ round** əhatəyə /mühasirəyə almaq;
◊ **to ~ the colour** bayrağı təntənəli şəkildə gətirmək
**troop-carrier** ['tru:p,kærɪə<sup>r</sup>] *n* **1.** *av.* nəqliyyat-desant təyyarəsi; **2.** *hərb.* şəxsi heyəti daşımaq/aparmaq üçün transportyor
**troop duty** ['tru:p'dju:tɪ] *n hərb.* döyüş xidməti; hərbi xidmət
**trooper** ['tru:pə<sup>r</sup>] *n* **1.** süvari, atlı; süvari əsgər; **2.** zirehli tank qoşunları əsgəri; **3.** paraşüt-desant qoşunları əsgəri; **4.** *amer.* atlı polis; **5.** *amer. d.d.* polis;
◊ **to swear like a ~** söyüş söymək, küçə söyüşü söymək, ağzına gələni demək
**troopship** ['tru:pʃɪp] *n* əsgərləri daşımaq/aparmaq üçün nəqliyyat
**troop-train** ['tru:ptreɪn] *n* hərbi eşelon, qoşun qatarı
**trope** [troup] *n ədəb.* kinayə, məcaz; məcazi mənada işlədilən söz/ifadə
**trophy** ['troufɪ] *n* **1.** qənimət; **war ~** müharibə qəniməti; **2.** *amer.* kubok; mükafat, xatirə hədiyyəsi
**tropic** ['trɔpɪk] *n* tropik, mədar *(ekvatora müvazi olan xəyali dairə)*; **the ~s** tropiklər *(tropik qurşaq ölkələri)*; **to live in the ~s** tropik ölkələrdə yaşamaq
**tropical** ['trɔpɪkəl] *adj* **1.** tropik; **heavy ~ rains** güclü tropik yağışlar; **~ forests** tropik meşələr; **2.** çox isti, qaynar, qızğın; **3.** *ədəb.* məcazlı, məcazi
**trot**[1] [trɔt] *n* **1.** löhrəm/yortma yeriş; **at a ~** löhrəm yerişlə, yortaraq, yorta-yorta; *The horse broke into a trot At yortmağa başladı*; **2.** sürətli/cəld yeriş; **3.** yeriməyi öyrənən uşaq; yeriməyə təzəcə başlayan uşaq;
◊ **to keep *smb.* on the ~** bir kəsə rahatlıq verməmək; *He keeps us on the trot O bizə rahatlıq vermir*
**trot**[2] [trɔt] *v* **(-tt-) 1.** yortmaq, löhrəm/yortma yerimək; **to ~ a horse** atı yortma sürmək; **2.** yormaq, əldən salmaq; **to ~ a person off his legs** adamı əldən salmaq/yormaq; **3.** qaçmaq, tələsmək; *I must be trotting off home Mən evə tələsməliyəm/ qaçmalıyam*; **to ~ about** vurnuxmaq, boş-boşuna çalışmaq/ tələsmək/çapalamaq; **to ~ out** göstərmək *(yortma yerişi, malı)*; **to ~ round** aparmaq, göstərmək *(şəhəri və s.)*; *I'll trot you and show the college Mən aparıb kolleci sənə/sizə göstərəcəm;*
◊ **to ~ *smb.* off his legs/to death** bir kəsi lap yormaq/yorub əldən salmaq
**troth** [trouθ] *n arx.* həqiqət, təmiz/doğru söz; **by my ~** vicdanım haqqı; **in ~** həqiqətən, doğrudan da, gerçəkdən; **to plight *one's* ~** söz vermək *(xüs. nişanlanma vaxtı)*
**trotter** ['trɔtə<sup>r</sup>] *n* **1.** rısak, löhrəm at; **2.** *pl* ayaqlar *(donuzun və s. bişmiş halda)*
**trotyl** ['troutɪl] *n kim.* trotil *(bərk partlayıcı maddə)*
**troubadour** ['tru:bəduə<sup>r</sup>] *n ədəb. tar.* trubadur, menestrel *(orta əsrlərdə İngiltərədə və Fransada gəzərgi şair və çalğıçı)*
**trouble**[1] ['trʌbl] *n* **1.** narahatlıq; həyəcan, təşviş, iztirab, təlaş; *Her heart was full of trouble Onun ürəyi çox narahat idi*; **2.** qayğı, əziyyət, zəhmət; *məc.* başağrısı; **to give *smb.* ~, to put *smb.* to ~** bir kəsi narahat etmək, bir kəsə əziyyət/zəhmət vermək; *Thank you for the trouble you took over my son Oğluma göstərdiyin/ göstərdiyiniz qayğıya görə sağ ol/olun*; *He takes much trouble O çox zəhmət çəkir; No trouble at all Əsla əziyyət deyil*; **3.** çətinlik, maneə, əngəl; zor, qüvvət; səy; *I had some trouble reading his*

*handwriting Onun xəttini/ əlyazmasını oxumaqda bir qədər çətinlik çəkdim;* 4. pis iş/xəbər; kədər, dərd, qəm, qüssə, nisgil; 5. müsibət, bəla, bədbəxtlik; **to be in ~** bəlaya/dərdə düşmək; **to get into ~** bəlaya düçar olmaq; **to make ~ for *smb.*** bir kəsi dərdə salmaq/qəmə qərq etmək; 6. həyəcan, vəlvələ, çaxnaşma, təşviş; nizamsızlıq, qarışıqlıq, qaydasızlıq; **racial ~s** irqi çaxnaşmalar/ qarışıqlıqlar; 7. *tib.* xəstəlik, naxoşluq, azar; **heart ~** ürək xəstəliyi; *He has chest trouble Onun ağ ciyərləri xəstədir;* 8. *tex.* qüsur, nöqsan; xarablıq, nasazlıq; *The mechanic soon put the trouble right Mexanik nasazlığı tezliklə aradan qaldırdı;*

◊ *What's the trouble? Nə olub?*; **to ask/to look for ~** qorxulu işə girişmək; tam ehtiyatsızlıq etmək, özünü oda atmaq

**trouble[2]** ['trʌbl] *v* 1. narahat/nigaran olmaq; 2. narahat etmək, əziyyət vermək, incitmək; *My leg troubles me Ayağım məni narahat edir; He was troubled by debts Onu borcları narahat edirdi;* 3. zəhmət vermək, çətinliyə/ zəhmətə salmaq, yormaq; *Don't trouble to return the pen Qələmi qaytarmağa zəhmət çəkmə/ çəkməyin; May I trouble you for a match? Səndən/Sizdən kibrit almaq olar?*; 4. səy göstərmək, özünə zəhmət/ əziyyət vermək; *He never troubled even to answer O heç özünə əziyyət verib cavab da vermədi;* 5. *məc.* qarışdırmaq, bulandırmaq; *The waters were troubled Sular bulandırıldı;* 6. *d.d.* ara qarışdırmaq, fitnə/çaxnaşma/həyəcan salmaq; 7. *tex.* pozmaq, korlamaq, xarab etmək, zədələmək;

◊ **to ~ water** su bulandırmaq; ara qızışdırmaq

**troubled** ['trʌbld] *adj* 1. narahat; həyəcanlı, iztirablı; **~ look** narahat baxış; 2. fırtınalı, tufan əlamətini bildirən; **~ sky** tufan əlamətli səma;

◊ **~ waters** dolaşıq/mürəkkəb vəziyyət; **to fish in ~ waters** bulanıq suda balıq tutmaq

**trouble-free** ['trʌblfri:] *adj* etibarlı, mötəbər, sədaqətli, möhkəm, əngəlsiz

**troublemaker** ['trʌbl.meɪkə[r]] *n* araqarışdıran, fitnə salan, iğtişaşçı, qarışıqlıq salan, fitnəkar, fəsadçı *(adam)*

**trouble-shooter** ['trʌbl.ʃu:tə[r]] *n* 1. qəza montyoru; 2. konflikt/münaqişə həll edən *(xüsusi səlahiyyətli adam)*

**troublesome** ['trʌblsəm] *adj* 1. narahatlıq törədən; narahat; 2. əziyyətli, əzablı, üzücü; *A smoker has a troublesome cough Siqaretçəkən adamın üzücü öskürəyi olur;* 3. intizamsız, çətin, nadinc; **a ~ child** narahat/çətin/nadinc uşaq; **a ~ problem** mürəkkəb məsələ

**troublous** ['trʌbləs] *adj* qarışıq, narahat, iztirablı; təlatümlü, əsəbi; **~ times** iğtişaşlı /qarışıq/həyəcanlı/ narahat vaxtlar

**trough** [trɔf] *n* 1. yem təknəsi/qutusu, axur; 2. xəmir təknəsi/tabağı; 3. nov, navalça; 4. çala, çökək, oyuq, çuxur

**trounce** [trauns] *v* 1. vurmaq, döymək, döyəcləmək; 2. *d.d.* sındırmaq, darmadağın etmək; 3. ciddi danlamaq/ söymək

**troupe** [tru:p] *n fr.* truppa *(artistlər kollektivi/dəstəsi)*

**trousered** ['trauzəd] *adj* şalvar geyinmiş, əynində şalvar olan

**trousering** ['trauzərɪŋ] *n* şalvarlıq, şalvarlıq parça

**trouser-leg** ['trauzəleg] *n* balaq *(şalvarda, tumanda)*

**trousers** ['trauzəz] *n pl* şalvar; **a new pair of ~** təzə şalvar

**trouser-stretcher** ['trauzə.stretʃə[r]] *n* aşırma, çiyin qayışı *(şalvarı beldə saxlamaq üçün)*, çiyinbağı

**trouser stripe** ['trauzəstraɪp] *n* lampas *(şalvarın yanlarına tikilən rəngli parça zolağı)*

**trousseau** ['tru:sou] *n* cehiz

**trout** [traut] *n zool.* alabalıq; **a smoked ~** hisə verilmiş alabalıq

**trowel[1]** ['trauəl] *n* 1. *tik.* mala, kəmçə, malakeş; 2. kürək, bel;

◊ **to lay it on with/with a ~ 1)** şişirtmək, artırmaq, mübaliğə etmək; 2) aşkar/açıq yaltaqlıq etmək

**trowel[2]** ['trauəl] *v* 1. *tik.* mala çəkmək, hamarlamaq; 2. qaba qat vurmaq; 3. aşkar yaltaqlıq etmək

**truancy** ['tru:ənsɪ] *n* icazəsiz gəlməmə/çıxmama *(iş, dərsə)*; proqul *(üzürsüz işə çıxmama)*

**truant[1]** ['tru:ənt] *n* 1. proqulçu, proqul edən, üzürsüz işə çıxmayan adam, üzürsüz dərsə gəlməyən *(şagird, tələbə və s.)*; **to play ~** proqul etmək, işə çıxmamaq, dərsə gəlməmək; 2. tənbəl

**truant[2]** ['tru:ənt] *adj* 1. tənbəl; boş, avara, veyl; 2. vəzifə borcuna əhəmiyyət verməyən/laqeyd baxan

**truce** [tru:s] *n* 1. barışıq, sülh; atəşkəs; **to call a ~** barışığa çağırmaq; **the flag of ~** parlamentyor/elçi bayrağı *(düşmənlə danışığa girmək üçün göndərilən nümayəndənin götürdüyü ağ bayraq)*; 2. son; kəsmə, qurtarma, dayandırma, nəhayət vermə; *Truce to jesting! Zarafat bəsdir! Zarafatı qurtar/qurtarın!* 3. fasilə, ara; dinclik

**truck[1]** [trʌk] *n* 1. mübadilə, dəyişdirmə, dəyişmə; 2. xırda mal; 3. əlaqə, rabitə, münasibət; *I want no truck with him Mən onunla heç bir əlaqə saxlamaq istəmirəm;* 4. cır-cındır, zir-zibil, dəyərsiz şeylər; 5. *d.d.* cəfəngiyyat, boş/mənasız söz, mənasız iş, boş şey; 6. *amer.* tərəvəz, göyərti *(satış üçün yetişdirilən)*; 7. yük maşını/ avtomobili; 8. *d.y.* yük arabacığı; yük vaqoneti *(kiçik vaqon)*; 9. *d.y.* açıq yük platforması; 10. *tex.* vərdənə, yolbasan *(maşın)*

**truck[2]** [trʌk] *v* 1. **(with, for)** mübadilə etmək, dəyişdirmək, dəyişmək; 2. mal/əmtəə mübadiləsi aparmaq; 3. səyyar mal satışı təşkil etmək; 4. natura/mal ilə ödəmək; 5. *amer.* tərəvəz /göyərti yetişdirmək, tərəvəzçiliklə məşğul ol-



maq; 6. yük avtomobili /yük maşını ilə daşımaq; 7. yük maşınına yükləmək

**truckage** ['trʌkɪdʒ] *n* 1. yük maşını ilə daşıma; 2. daşınma haqqı/ödənişi

**trucker** ['trʌkə[r]] *n* 1. yük avtomobili sürücüsü; 2. *amer.* tərəvəz yetişdirən fermer

**truck-farm** ['trʌkfa:m] *n amer.* tərəvəzçilik təsərrüfatı /ferması

**truck-farmer** ['trʌkfa:mə[r]] *n amer.* dirrikçi, bostançı, tərəvəzçi

**truckle** ['trʌkl] *v* **(to)** yaltaqlıq etmək, alçalmaq, qorxa-qorxa tabe olmaq; *It's disgusting the way he truckles to the boss Onun rəisinə yaltaqlanma manerası iyrəncdir*

**truckler** ['trʌklə[r]] *n* yaltaq

**truckman** ['trʌkmən] *n* = **trucker**

**truck tractor** ['trʌk'træktə[r]] *n* dartıcı/yedəkçi traktor

**truck-trailor** ['trʌk.treɪlə[r]] *n* qoşqulu yük avtomobili

**truculent** ['trʌkjulənt] *adj* 1. qəzəbli, qeyzli, hirsli, hiddətli, azğın; 2. qaba, kobud, ədəbsiz, sərt; 3. təcavüzkar

**trudge[1]** [trʌdʒ] *n* uzaq və çətin yol; yorucu gəzinti

**trudge[2]** [trʌdʒ] *v* çətinliklə yerimək, yorğun-yorğun sürünmək; *He trudged wearily up the hill O, çətinliklə/ sürünə-sürünə dağa çıxdı*; **to ~ through the mud** palçıqdan çətinliklə keçib getmək

**true[1]** [tru:] *adj* 1. düz, düzgün, doğru; **a ~ story** doğru əhvalat; *Is the news true? Xəbər doğrudurmu?* 2. sadiq, sədaqətli, vəfalı; **a ~ friend** vəfalı/sadiq dost; **to be ~ to *one's* word /promise** sözünə/vədinə sədaqətli olmaq; 3. real, həqiqi, əsl; **a ~ ruby** həqiqi yaqut; **~ love** əsl məhəbbət; *True friendship should last forever Həqiqi dostluq daimi olmalıdır;* 4. dəqiq, dürüst, düzgün; **~ to life** həyati gerçəklik, reallıq; 5. qanuni, həqiqi; **a ~ copy** təsdiqlənmiş surət *(sənədin)*; **like a ~ scholar** əsl alim kimi;

◊ **to come ~** həqiqətə çevrilmək, həyata keçmək *(arzu, istək və s. haq.)*

**true[2]** [tru:] *v* 1. *tex.* düzəltmək, yerinə salmaq, quraşdırmaq, yerləşdirmək; 2. *tex.* yoxlamaq, yoxlayıb düzəltmək; nizama/qaydaya salmaq

**true[3]** [tru:] *adv* 1. doğru, düz, düzgün, gerçək; *Tell me true Mənə düzünü de/deyin; His words ring true Onun sözləri doğru səslənir;* 2. dürüst, düz, tamamilə, eyni ilə, dümdüz; **to aim ~** dürüst nişan almaq, düz tuşlamaq

**true bill** ['tru:'bɪl] *n hüq.* təsdiqlənmiş ittihamnamə /ittiham aktı

**true blue** ['tru:'blu:] *adj d.d.* 1. ardıcıl, sistematik; 2. möhkəm, davamlı, dözümlü, səbatlı, çalışqan; 3. *məc.* çox sadiq, sözünün ağası

**true-born** ['tru:'bɔ:n] *adj* 1. əsil, safqanlı; 2. anadangəlmə, fitri

**true-bred** ['tru:'bred] *adj* 1. nəcabətli, əsil-nəsilli; 2. yaxşı tərbiyəli, ədəbli; 3. əsil, əsilli, safqanlı

**true-hearted** ['tru:'ha:tɪd] *adj* səmimi, ürəyiaçıq, həqiqi; sadiq, sədaqətli, vəfalı

**true-love** ['tru:lʌv] *n* sevgili, canan; sevimli, istəkli

**truepenny** ['tru:.penɪ] *n arx.* təmiz/pak adam, etibarlı/ sədaqətli adam

**truffle** ['trʌfl] *n bot.* yerdombalanı *(göbələk)*

**truffled** ['trʌfld] *adj* yerdombalanından (göbələkdən) hazırlanmış

**truism** ['tru:ɪzm] *n* çeynənmiş şey, hər kəsə məlum olan şey

**trull** [trʌl] *n arx.* fahişə, qəhbə

**truly** ['tru:lɪ] *adv* 1. doğru, düz, düzgün, gerçək; 2. ürəkdən, qəlbdən, səmimiyyətlə, səmimi; 3. həqiqətən, doğrudan-doğruya, doğrudan da; *Truly it was difficult Bu, doğrudan da çətin idi; I love you truly Mən səni/sizi həqiqətən sevirəm;* 4. lap, tam, tamamilə;

◊ *Yours truly... Səmimiyyətlə sizin... (məktubun sonunda yazılır)*

**trump[1]** [trʌmp] *n* 1. kozır *(kart oyununda baş xal)*; **to play a ~** kozırla oynamaq/getmək *(qumarda)*; **to put a person to his ~s 1)** bir kəsi kozırla oynamağa məcbur etmək; 2) *məc.* bir kəsi son vasitəyə əl atmağa məcbur etmək; **to have all the ~s in *one's* hand 1)** bütün kozırlar əlində olmaq; 2) *məc.* hər şey əlində olmaq; vəziyyətin ağası olmaq;

◊ **the last ~, the ~ of doom** Suri-İsrafil, İsrafilin zur düdüyü *(qiyamət günündə çalınacaq düdük səsi)*

**trump[2]** [trʌmp] *v* 1. kozırla oynamaq *(qumarda)*, kozırla getmək/vurmaq; 2. üstün gəlmək, ötmək, ötüb keçmək; **to ~ up** uydurmaq, qondarmaq, düzəltmək, quraşdırmaq; **to ~ up a charge against *smb.*** bir kəsin əleyhinə ittiham uydurmaq/ quraşdırmaq

**trumpery[1]** ['trʌmpərɪ] *n* 1. bəzək, zahiri bər-bəzək; 2. yaramaz, murdar, alçaq, rəzil *(adam)*

**trumpery[2]** ['trʌmpərɪ] *adj* 1. saxta, zahiri, yalançı, süni; 2. yaramaz, yararsız, pis, alçaq, gərəksiz

**trumpet[1]** ['trʌmpɪt] *n* 1. *mus.* truba, boru, kərənay *(nəfəslə çalınan musiqi aləti)*; **to sound the ~** boru/kərənay çalmaq; **ear ~** eşitmə borusu; 2. boru ağzı; 3. rupor *(səsgücləndirən boru)*; 4. boru səsi/sədası; **the sound of ~s** şeypurların səsi; 5. fil bağırtısı/böyürtüsü;

◊ **to blow *one's* ~** özünü tərifləmək/öymək, öyünmək, lovğalanmaq, özünü reklam etməklə məşğul olmaq

**trumpet[2]** ['trʌmpɪt] *v* 1. boru/kərənay çalmaq; siqnal vermək; 2. xəbər vermək, bildirmək, yaymaq, elan etmək; 3. böyürmək, bağırmaq *(fil haq.)*

**trumpet-call** ['trʌmpɪtkɔ:l] *n* 1. boru/kərənay səsi; 2. fəaliyyətə səsləmə, hərəkət etməyə çağırış

**trumpeter** ['trʌmpɪtə'] *n* **1.** truba/kərənay/boru çalan; boruçu, kərənayçı; **2.** lüləquyruq göyərçin; **3.** *amer.* carçı, elan edən, bildirən *(adam)*;
◊ **to be *one's* own ~** özünü tərifləmək/öymək, öyünmək, lovğalanmaq, özünü reklam etmək
**truncate** ['trʌŋkeɪt] *v* **1.** kəsmək, kəsib qısaltmaq /gödəltmək; **2.** azaltmaq, qısaltmaq *(nitqi, məqaləni və s.)*; **3.** şikəst etmək
**truncated** ['trʌŋkeɪtɪd] *adj hənd.* kəsik; **~ pyramid** kəsik piramida
**truncheon** ['trʌntʃən] *n* **1.** *d.y.* jezl *(qatarların hərəkətini nizamlamaq üçün işlədilən metal çubuq)*; **2.** dəyənək, kötək *(polisin işlətdiyi)*; **3.** *d.d.* küt adam, qanmaz
**trundle¹** ['trʌndl] *n* təkərcik, çarxcıq
**trundle²** ['trʌndl] *v* yavaş-yavaş diyirlətmək/ yumalamaq/diyirlədə-diyirlədə aparmaq; *The porter trundled his barrow along the platform Yükdaşıyan əl arabasını diyirlədə-diyirlədə platformada apardı*
**trundle-bed** ['trʌndlbed] *n* diyircəkli çarpayı, açılan-qatlanan çarpayı
**trunk** [trʌŋk] *n* **1.** gövdə *(ağacda)*; **2.** bədən, gövdə; **3.** magistral, ana xətt *(dəniz yolu, elektrik, telefon, teleqraf və s. şəbəkəsinin əsas xətti)*; **4.** yol çamadanı; **5.** xortum *(fildə)*; **6.** *pl* trusu, qısa idman tumanı; **7.** *tex.* sütun qəlibi *(tökmə işində)*; **8.** *anat.* arteriya *(ürəkdən bədən üzvlərinə qan aparan damar)*; **9.** nov, navalça; boru; **10.** yük yeri *(avtomobildə)*;
◊ **to live in *one's* ~s** qaraçı kimi yaşamaq
**trunk-call** ['trʌŋk'kɔ:l] *n* şəhərlərarası telefon
**trunk drawers** ['trʌŋk'drɔ:z] *n* kişi tumanı *(dizə qədər olan)*, alt tumanı
**trunk-line** ['trʌŋklaɪn] *n* magistral xətt/yol
**trunk-railway** ['trʌŋk.reɪlweɪ] *n* magistral dəmir yolu
**truss¹** [trʌs] *n* **1.** bağlama, bağlı, dəstə *(küləş, saman, quru ot)*; bir çəngə/ ovuc/bağlama; **2.** salxım; dəstə; **3.** *tib.* bandaj *(sarğı, kəmər, qurşaq)*; **4.** tir *(damı, körpünü və s. saxlamaq üçün)*
**truss²** [trʌs] *v* **1.** dəst bağlamaq *(həm də* **to ~ up***)*; **2.** bir-birinə sarımaq, qolunu-qanadını bağlamaq *(quşu, toyuğu qızardarkən)*; **3.** əl-qolunu bağlamaq *(cinayətkarın)*; *The policeman trussed up the struggling criminal with rope Polis müqavimət göstərən cinayətkarın qollarını kəndirlə bağladı*; **4.** bərkitmək, möhkəmləndirmək
**trust¹** [trʌst] *n* **1.** etibar, inam, etimad; **to have/to put/to repose ~ in** inanmaq, etibar etmək, inanıb tapşırmaq; **to place *one's* ~ in** etimad göstərmək; **to take on ~** inanmaq; **2.** məsuliyyət, cavabdehlik, borc, öhdəlik; **a position of ~** məsuliyyətli/məsul vəzifə; **3.** ümid; *He puts trust in the future O, gələcəyə ümid edir*; **4.** *mal.* kredit; nisyə, borc; **to supply goods on ~** kreditə mal buraxmaq; **5.** *hüq.* qəyyumluq; qəyyum; **to have *smth.* in ~** bir şeyin üzərində qəyyumluq hüququ olmaq; *He left money in a trust for his children's education O, uşaqlarının təhsil alması üçün qəyyuma pul verdi*; **6.** *hüq.* vəkalətli mülkiyyət, vəkalət kağızı/vəkalətnamə ilə verilən/etibar edilən mülkiyyət; *The property is held in trust Əmlak vəkalətnamə ilə idarə olunur*; **7.** trest, konsern *(ümumi maliyyə rəhbərliyi altında birlik)*
**trust²** [trʌst] *adj* inanılmış, inanılıb tapşırılmış/ verilmiş; vəkil edilmiş
**trust³** [trʌst] *v* **1.** inanmaq, inanıb tapşırmaq, etibar etmək, ürəyi qızmaq; arxayın olmaq, bel bağlamaq; *He is not to be trusted Ona etibar etmək olmaz; You can't trust a word he says Onun heç bir sözünə/ kəlməsinə də inanmaq olmaz*; **2.** tapşırmaq, inanıb tapşırmaq, həvalə etmək, öhdəsinə buraxmaq; *You can trust him to do the job properly Bu işin lazımi qaydada icrasını ona tapşırmaq olar*; **to ~ *smb.* with *smth.*** bir kəsə bir şeyi tapşırmaq/ həvalə etmək; **3.** arxayın olmaq, ümid etmək, əmin olmaq; sanmaq, hesab etmək; *I trust you will be better soon Ümid edirəm ki, sən/siz tezliklə sağalacaqsan/ sağalacaqsınız; Trust him to spoil things! Arxayın ola bilərsən/bilərsiniz ki, o hər şeyi korlayacaq!* **4.** kredit /kreditə vermək
**trust-deed** ['trʌst'di:d] *n hüq.* vəkalətli mülkiyyətin təsis aktı
**trustee¹** [trʌs'ti:] *n* **1.** *hüq.* qəyyum *(uşağın)*, hami, himayəçi; **Public Trustee** dövlət himayəçisi; **2.** qəyyumluğu /hamiliyi icra edən dövlət; **3.** idarə heyəti üzvü, şura üzvü; **Board of ~s** qəyyumlar/ himayəçilər şurası
**trustee²** ['trʌsti:] *v* himayəyə vermək
**trusteeship** [trʌs'ti:ʃɪp] *n hüq.* qəyyumluq, hamilik
**trustful** ['trʌstful] *adj* tez inanan, hər kəsə inanan; sadəlövh
**trustiness** ['trʌstɪnɪs] *n* düzlük, doğruluq, loyallıq *(qanunamüvafiq)*; etibarlılıq, mötəbərlik, sadiqlik, möhkəmlik
**trustingly** ['trʌstɪŋlɪ] *adv* hər kəsə inanaraq; sadəlövhlüklə, sadəlövhcəsinə
**trustless** ['trʌstlɪs] *adj* **1.** etibarsız; **2.** heç kəsə inanmayan/etibar etməyən; hər şeydən şübhələnən, şübhəli
**trust territory** ['trʌst'terɪtərɪ] *n siya.* qəyyumluq altında olan ərazi
**trustworthiness** ['trʌst.wə:ðɪnɪs] *n* etibarlılıq, sədaqətlilik, mötəbərlik
**trustworthy** ['trʌst.wə:ðɪ] *adj* etibarlı, etibara layiq, bel bağlanıla bilən, sədaqətli, mötəbər, möhkəm
**trusty¹** ['trʌstɪ] *n* **1.** etibarlı adam; **2.** *d.d.* nümunəvi davranışına görə müəyyən imtiyazlara malik dustaq/məhbus
**trusty²** ['trʌstɪ] *adj d.d.* sadiq, sədaqətli, vəfalı, etibarlı, möhkəm, mötəbər
**truth** [tru:θ] *n* **1.** həqiqət, düzlük, doğruluq, gerçəklik; **to tell/to speak the ~ 1)** həqiqəti demək /danışmaq; **2)** doğrusunu/düzünü desək; *I told him a few home/bitter truths Bir neçə acı həqiqəti mən onun üzünə dedim*; **the ~s of science** elmi həqiqətlər; *The truth will come out Həqiqət üzə çıxacaq/məlum olacaq*; **2.** doğruluq, gerçəklik, doğruçuluq, düzlük; **3.** dəqiqlik, dürüstlük, düzgünlük; uyğunluq, müvafiqlik, mütabiqlik; **~ to nature** həyati həqiqət, realizm, reallıq; **4.** *tex.* qurğunun/mexanizmin düzgün quraşdırılması;
◊ **in ~** həqiqətdə, həqiqətən; *It was in truth a miracle Həqiqətən o, möcüzə idi*
**truthful** [tru:θfl] *adj* **1.** doğru, düz, düzgün, gerçək, düzdanışan; **a ~ child** düzdanışan uşaq; *Are you being quite truthful? Sən/Siz doğru deyirsən/ deyirsiniz?*; **2.** həqiqi, şübhəsiz, şəksiz, labüd
**truthfully** ['tru:θflɪ] *adv* doğru, düzgün; düz
**truthfulness** ['tru:θflnɪs] *n* **1.** doğruluq, gerçəklik, düzlük, doğruluq; **2.** dəqiqlik, sadiqlik, vəfalılıq
**try¹** [traɪ] *n* **1.** cəhd, səy; **to have/to make a ~ at/for *smth.*** bir şey etməyə cəhd/səy göstərmək; *He had three tries and failed each time O, üç dəfə cəhd etdi və hər dəfə də müvəffəq olmadı; It's worth a try Səy göstərməyə dəyər*; **2.** təcrübə, sınaq; **to give *smth.* a ~** bir şeyi sınaqdan keçirmək; **to give *smb.* a ~** bir kəsə sınaqdan keçməyə imkan yaratmaq/ vermək; **3.** *id.* rəqib komandanın qapı xəttinə daxil olması; **4.** xal qazanma *(Reqbi oyununda)*
**try²** [traɪ] *v (pt, pp* **tried)** **1.** yoxlamaq, təcrübədən/ sınaqdan keçirmək; **to ~ *one's* fortune** bəxtini sınamaq; *Try the other window, which may not be locked Başqa pəncərəni yoxla/yoxlayın, bəlkə də o bağlanmayıb*; **2.** cəhd etmək, səy göstərmək; **to ~ *one's* best** əlindən gələni etmək; *Do try to come Çalış/Çalışın mütləq gəl/gəlin*; **3.** ittiham etmək, təqsirləndirmək, günahlandırmaq; istintaq aparmaq; araşdırmaq; *He is tried for murder O, adam öldürməkdə təqsirli bilinir; The judge tried the case Hakim işi araşdırdı; They tried him and found him innocent Onlar onun işini araşdırdılar və günahsız olduğunu aşkara çıxartdılar*; **4.** yormaq, əldən salmaq, üzmək, darıxdırmaq, sıxmaq; *The small print tries my eyes Bu xırda şrift mənim gözlərimi yorur*; **5.** qıcıqlandırmaq, əziyyət vermək, incitmək; **to ~ *smb.'s* patience** bir kəsin əsəblərini qıcıqlandırmaq; **6.** əritmək *(piyi və s.)*; **7.** dadmaq, dadına baxmaq *(ərzağın, xörəyin və s.)*; *Try the soup! Supun dadına bax/baxın!*; **to ~ back 1)** ilkin vəziyyətə qayıtmaq *(izi itirən it haq.)*; **2)** *məc.* ziyanın yarısından qayıtmaq; **to ~ for** nail olmaq; axtarmaq; *He is trying for a job in the firm O, şirkətdə işə girməyə çalışır*; **to ~ on 1)** geyib baxmaq, geyib ölçüsünü yoxlamaq; **2)** *d.d.* təcrübə keçirmək, sınamaq; *It's no use trying it on with me Mənə bu kələyi gələ bilməzsən/bilməzsiniz, Bu kələk keçməz*; **to ~ out** yoxlamaq, təcrübədən keçirmək, sınaqdan çıxarmaq; *The idea seems good but it needs to be tried out İdeya yaxşı görünür, amma onu yoxlamaq gərəkdir/lazımdır;*
◊ **to ~ *one's* hand at *smth.*** bir şeydə gücünü yoxlamaq/sınamaq
**trying** ['traɪɪŋ] *adj* **1.** çətin, ağır; əziyyətli; **a ~ situation** ağır/çətin vəziyyət; *Those were very trying times O vaxtlar çox ağır zamanlar idi*; **2.** qıcıqlandırıcı, zəhlətökən; **~ to the health** cana ziyanlı, səhhətə zərərli
**trying-plane** ['traɪɪŋpleɪn] *n* uzun rəndə
**try-on** ['traɪ'ɔn] *n* **1.** ölçmə, geyib baxma; **2.** *d.d.* kələk gəlmə, aldatmaq cəhdi
**try-out** ['traɪ'aut] *n d.d.* sınama, yoxlama; məşq, məşq etmə
**tsar** [za:] *n (həm də* **czar**) çar, padşah, hökmdar
**tsarina** [za:'ri:nə] *n* çariça; çar/padşah arvadı
**tsarism** [za:'rɪzm] *n* çarizm, çar üsul-idarəsi
**T-shirt** ['ti:ʃə:t] *n* tenniska
**tub¹** [tʌb] *n* **1.** çəllək, badya, qulplu çəllək, boçka; **2.** ləyən; **a washing ~** paltar yumaq üçün ləyən; **3.** vanna; **to have a cold ~ before breakfast** səhər yeməyindən əvvəl soyuq vanna qəbul etmək/ çimmək; **4.** təlim qayığı; lənggedişli qayıq; **5.** *miner.* şaxta/ mədən vaqoneti; filiz yığmaq/doldurmaq üçün yeşik/qutu;
◊ *Let every tub stand on its bottom Qoy/Qoyun hər kəs öz qayğısına/dərdinə qalsın*
**tub²** [tʌb] *v* **1.** *d.d.* vannada yuyunmaq; **2.** çəlləkdə bitki əkmək; **3.** *d.d.* avarçəkmə məşqi etmək
**tuba** ['tju:bə] *n mus.* tuba *(nəfəslə çalınan ən alçaq tonlu uzun musiqi aləti)*
**tubbing** ['tʌbɪŋ] *n tex.* sukeçirməyən dayaq *(şaxtada)*
**tubby** ['tʌbɪ] *adj* **1.** boçkayabənzər, çəlləkvarı, çəlləyəoxşar; **2.** qısa ayaqlı və kök *(adam)*; **3.** boğuq səs çıxaran *(musiqi aləti haq.)*
**tube¹** [tju:b] *n* **1.** boru, borucuq; **the bronchial ~s** bronxial borular; **2.** tübik *(içərisində yarı maye maddələr saxlamaq üçün yumşaq borucuq)*; **a toothpaste ~** diş pastası tübiki; **3.** tunel *(dağların, ya yerin altından açılan yol)*; **4.** metro, metropoliten *(Londonda)*; *I'm going by tube Mən metro ilə gedəcəyəm*; **5.** kamera, hava ilə doldurulmuş rezin kisə/şin; **an inner ~** kamera, təkərin içərisinə yerləşdirilən kamera; **6.** *rad.* elektron lampa; **7.** *sl.* televizor
**tube²** [tju:b] *v* **1.** boruya salmaq; **2.** boru şəklinə salmaq, boruya/lüləyə oxşatmaq
**tubeless** ['tju:blɪs] *adj* kamerasız; **a ~ tyre** kamerasız təkər
**tuberculin** [tju'bə:kjulɪn] *n tib.* tuberkulin *(diaqnostik və müalicə məqsədilə işlənən maddə)*
**tuberculosis** [tju.bə:kju'lousɪs] *n tib.* vərəm
**tuberculous** [tju'bə:kjuləs] *adj* vərəm, vərəmli

**tubing** [ˈtju:bıŋ] *n* 1. *tex.* boru, boru kəməri; 2. *tex.* boru çəkilişi

**tub-thumper** [ˈtʌb.θʌmpəʳ] *n* təmtəraqla danışan təbliğatçı

**tub-thumping**[1] [ˈtʌb.θʌmpıŋ] *n* təmtəraqlı nitq

**tub-thumping**[2] [ˈtʌb.θʌmpıŋ] *adj* təmtəraqlı, qəliz, ibarəli *(nitq haq.)*

**tubular** [ˈtju:bjulə] *adj* 1. boruşəkilli, boruyaoxşar; ~ **steelwork** boruşəkilli metal konstruksiyalar; ~ **railway** yeraltı dəmir yolu; 2. borularla təchiz olunmuş

**tubulate** [ˈtju:bjuleıt] *v* 1. boruyaoxşar forma vermək/formaya salmaq; 2. boru ilə təchiz/təmin etmək

**tubule** [ˈtju:bju:l] *n* kiçik boru, borucuq

**tuck**[1] [tʌk] *n* 1. bükük, büzmə, qırçın, qat *(paltarda)*; **to make a ~ in a dress** paltara qırçın /büzmə vurmaq; 2. *sl.* qida, yemək *(əsasən şirniyyat)*; 3. *d.d.* boru/şeypur səsi

**tuck**[2] [tʌk] *v* 1. qırçınlamaq, büzmək *(paltarı)*; büküş vurmaq; yığmaq; 2. qatlamaq, bükmək; 3. dürtmək, soxuşdurmaq; *He tucked his shirt into his trousers O, köynəyini şalvarın içinə saldı/soxdu*; 4. soxmaq, gizlətmək, qoymaq; *The bird tucked its head under its wing Quş başını qanadının altına soxdu*; 5. örtmək, üstünü basdırmaq; bələmək, yorğana bürümək; *She tucked the child up O, uşağı bələdi*; **to ~ away** acgözlüklə yemək/tıxmaq; *d.d.* dürtmək, acgözlüklə yemək; ötürmək, aşırmaq; *He tucked away two helpings O, iki pay xörəyi ötürdü /aşırdı*; **to ~ in** düzəltmək, səliqəyə salmaq; *She tucked the sheets in O, döşəkağlarını səliqəyə saldı/düzəltdi*; 2) acgözlüklə yemək; **to ~ up 1**) çırmalamaq, yığmaq, yığışdırmaq *(köynəyin qollarını, paltarın ətəyini və s.)*; *She took off her shoes, tucked up her skirt and waded across the stream O, ayaqqabılarını çıxartdı, ətəyini çırmaladı və çayı keçdi*

**tucker**[1] [ˈtʌkəʳ] *n* 1. kofta, bluza *(qadın köynəyi)*; döşlük *(qadın paltarında)*; 2. *d.d.* yemək, şirniyyat;

◊ ***one's* best bib and ~** ən yaxşı paltarı; *She was in her best bib and tucker O ən yaxşı paltarını geymişdi*

**tucker**[2] [ˈtʌkəʳ] *v d.d. amer.* yormaq, taqətdən/əldən salmaq, üzmək; *I'm all tuckered out Mən lap taqətdən düşmüşəm*

**tucket** [ˈtʌkıt] *n d.d.* fanfara, boru/şeypur siqnalı

**tuck-in** [ˈtʌkˈın] *n d.d.* tutumlu yemək, tutarlı qəlyanaltı

**tuck-shop** [ˈtʌkʃɔp] *n d.d.* şirniyyat/qənnadı mağazası

**Tudor** [ˈtju:də] *adj* Tüdor dövrü, Tüdorlar dövrü *(1485-1603-cü illərdə İngiltərəni idarə edən ailə)*; ~ **architecture** Tüdor dövrü memarlığı

**Tuesday** [ˈtju:zdeı, -di:] *n* çərşənbə axşamı; **last/next ~** keçən/gələn çərşənbə axşamı; *He was born on Tuesday O, çərşənbə axşamı doğulub/anadan olub; We went on the Sunday and came home on the Tuesday Biz bazar günü getdik və evə çərşənbə axşamı qayıtdıq*

**tuft** [tʌft] *n* çəngə; **a ~ of grass** bir çəngə ot; **a ~ of hair** bir çəngə tük/saç; kəkil

**tufted** [ˈtʌftıd] *adj* xovlu, tüklü; **a ~ carpet** tüklü/xovlu xalça

**tug**[1] [tʌg] *n* 1. dartma, dartınma; silkinmə; **to give a ~ at *smth*.** bir şeyi dartmaq; *She gave her sister's hair a sharp tug O, bacısının saçından bərk dartdı*; 2. = **tugboat**; 3. yan qayışı *(ağır şeyləri daşımaq və ya çəkmək üçün boyuna taxılan)*

**tug**[2] [tʌg] *v* (**-gg-**) 1. dartmaq, çəkmək; **to ~ at *smb.*'s sleeve** bir kəsin qolundan çəkmək/dartmaq *(diqqəti çəkmək üçün)*; *Don't tug my hair Mənim saçımdan dartma/dartmayın; We tugged so hard that the rope broke Biz elə bərk dartdıq ki, kəndir qırıldı*; 2. *məc.* (**at**) didmək, əziyyət vermək; *Recollections tugged at his heart Xatirələr onun ürəyini didirdi*; 3. yedəkləmək, yedəyə almaq/götürmək/yedəyə alıb aparmaq;

◊ **to ~ at the/an oar** ağır işlə məşğul olmaq

**tugboat** [ˈtʌgbout] *n* yedək gəmisi/qayığı

**tuggage** [ˈtʌgıdʒ] *n* 1. yedəkləmə, yedəyə alma; 2. yedəkləmə/yedəyə alma haqqı

**tuition** [ˈtjuˈıʃn; ˈtu-] *n* 1. öyrənmə, öyrətmə, təhsil vermə/alma; ~ **on the violin** skripka öyrənmə; 2. təhsil haqqı; **to pay *one's* ~** təhsil haqqını ödəmək/ vermək

**tule** [tu:l] *n bot.* qamış, qarğı

**tulip** [ˈtju:lıp] *n* 1. *bot.* lalə, qızıl zanbaq; 2. *bot.* tülpan *(çiçəkləri laləyə oxşayan ağac)*

**tulle** [tju:l, tu:l] *n* tül *(nazik tor parça)*

**tumble**[1] [ˈtʌmbl] *n* 1. yıxılma *(həm də məc)*; **to have a ~** yıxılmaq; 2. məğlubiyyət, məğlub olma, basılma; **the premier's ~ from office** baş nazirin məğlubiyyəti; 3. mayallaq vurma, mayallaq; 4. qarmaqarışıqlıq, səliqəsizlik, qarışıqlıq; *Things were all in a tumble Hər şey qarmaqarışıq idi*;

◊ **to give *smb.* a ~** bir kəslə maraqlanmaq, bir kəsə diqqət yetirmək

**tumble**[2] [ˈtʌmbl] *v* 1. yıxılmaq, düşmək, üzüaşağı gillənmək, diyirlənib düşmək; **to ~ off a horse** atdan yıxılmaq; **to ~ into a river** diyirlənib çaya düşmək; **to ~ down the stairs** pilləkəndən üzüaşağı gillənmək; *He tripped over a stone and tumbled O, daşın üstündə büdrədi və yıxıldı*; 2. uçmaq *(adət.* **to ~ down**); *Deserted buildings tumbled into ruins Baxımsız binalar yavaş-yavaş uçdu*; 3. nizamsız olaraq hərəkət etmək; *The boys tumbled out of the classroom Oğlanlar dəstə halında sinif otağından bayıra çıxdılar/axınışdılar*; 4. yumbalanmaq, eşələnmək; ağnamaq, çapalamaq, çırpınmaq; *The sick man tossed and tumbled in his bed Xəstə kişi narahat halda yatağında çapaladı/çırpındı*; 5. mayallaq vurmaq, dombalaq aşmaq, başı üstə çevrilmək; 6. atmaq, tullanmaq; *The accident tumbled the passengers out of the car Qəza sərnişinləri maşından bayıra atdı*; 7. atılmaq, tullanmaq; **to ~ into bed** yatağa /çarpayıya atılmaq; **to ~ out of bed** yataqdan atılıb qalxmaq; 8. səliqəsiz etmək; əzmək; **to ~ *one's* clothes** paltarını əzmək; **to ~ *one's* hair** saçını qarışdırmaq/ dolaşdırmaq /pırtlaşıq salmaq; **to ~ in 1**) yıxılmaq, düşmək *(bir şeyin içinə)*; 2) yıxılıb yatmaq; **to ~ over** büdrəmək, ayağı dolaşıb yıxılmaq; **to ~ to** *d.d.* anlamaq, başa düşmək; sezmək, duymaq, hiss etmək; **to ~ in an idea** fikri anlamaq/başa düşmək



**tumbledown** [ˈtʌmbldaun] *adj* uçmuş, dağılmış; yarımdağılmış, yarımsökülmüş, yarımxaraba; **a ~ house** yarımdağılmış/yarımxaraba ev

**tumbler** [ˈtʌmbləʳ] *n* 1. şərab/çaxır üçün stəkan; 2. stəkana yerləşən şərabın/çaxırın miqdarı; 3. akrobat, canbaz, sirk gimnastı; 4. hacıyatmaz *(uşaq oyuncağı)*; 5. mayallaq göyərçini

**tumbleweed** [ˈtʌmblwi:d] *n bot.* süprüm, kətyan *(çöl bitkisi)*

**tumescence** [tju:ˈmesns; tu:-] *n tib.* 1. şişmə; şişməyə meyllilik; 2. şiş

**tumescent** [tju:ˈmesnt; tu:m-] *adj tib.* şişən, şişmiş; qatmış *(cinsi oyanmadan)*

**tumid** [ˈtju:mıd; ˈtu:-] *adj* 1. şişmiş; 2. təmtəraqlı, ibarəli, qəliz; 3. boylu, hamilə

**tumidity** [tju:ˈmıdıtı; tu:ˈ-] *n* 1. şişmə; 2. şiş

**tummy** [ˈtʌmı] *n d.d.* qarın; **to lie on *one's* ~** qarnıüstə uzanmaq

**tummy-ache** [ˈtʌmıeık] *n d.d.* qarın ağrısı

**tumor** [ˈtju:məʳ] *n amer.* = **tumour**

**tumorous** [ˈtju:mərəs] *adj tib.* şişmiş

**tumour** [ˈtju:məʳ, ˈtu:-] *n* şiş; **malignant ~** bədxassəli şiş; **a brain ~** beyin şişi; **to die of a brain ~** beyin şişindən ölmək

**tumult** [ˈtju:mʌlt; tu:-] *n* 1. səs-küy, qalmaqal, qarışıqlıq, çaxnaşma, hərc-mərclik; 2. nizamsızlıq; səliqəsizlik; iğtişaş, həyəcan, şuluqluq; *The demonstration broke up in tumult Nümayiş iğtişaşa çevrildi*; 3. narahatlıq, nigaranlıq

**tumultuous** [tju:ˈmʌltʃuəs; tu:-] *adj* 1. səs-küylü, qızğın, alovlu, atəşin; coşğun; ~ **passions** qızğın/alovlu ehtiraslar; ~ **reception** səs-küylü/gurultulu qəbul; ~ **applause** gurultulu alqış; 2. həyəcanlı, narahat; ~ **meeting** həyəcanlı iclas: ~ **crowd** narahat kütlə

**tumulus** [ˈtju:mjələs; ˈtu:-] *n (pl* **tumuli** [-laı] kurqan *(qədim qəbirlər üzərində təpə)*

**tun**[1] [tʌn] *n* 1. böyük çəllək *(şərab, pivə və s. üçün)*; 2. həcm vahidi *(şərab, pivə və s. ölçmək üçün)*

**tun**[2] [tʌn] *v* (**-nn-**) 1. çəlləyə tökmək; 2. çəlləkdə saxlamaq *(şərabı, pivəni və s.)*

**tuna** [ˈtju:nə; ˈtu:nə] *n (cəmdə dəyişmir və ya -s qəbul edir)* 1. yeməli iri dəniz balığı; 2. bu balığın əti

**tune**[1] [tju:n; tu:n] *n* 1. melodiya, hava, mahnı; **popular ~** populyar melodiya/mahnı; **catchy ~** yaddaqalan melodiya/hava; *A lot of modern music has no tune Bir çox müasir musiqinin melodiyası/ahəngi yoxdur; He gave us a tune on his guitar O, gitarasında bizə bir mahnı/hava çaldı*; 2. melodiklik, ahəngdarlıq; *This piece has very little tune Bu pyesdə ahəngdarlıq azdır*; 3. kök *(musiqi alətində tonların uyğunluğu)*; **to be in ~** kökdə olmaq *(musiqi aləti haq.)*; **to be out of ~** kökdən düşmək, kökdə olmamaq *(musiqi aləti haq.)*; *The guitar is in tune Gitara kökdədir; The violin is out of tune Skripka kökdən düşüb/kökdə deyil*; **to put in ~** kökləmək *(musiqi alətini)*; 4. razılıq, həmrəylik, ahəngdarlıq; **to be in ~ with *smb*.** bir kəslə yola getmək/arası saz olmaq; **to be in ~ with *smth*.** bir şeylə uyğun olmaq/gəlmək, bir şeylə həmahəng olmaq; **to be out of ~ with *smb*.** bir kəslə yola getməmək;

◊ **to call the ~** ton vermək; rəhbər rol oynamaq *(bir işdə)*; **to change *one's* ~, to sing another/a different ~** tonu dəyişmək; başqa cür danışmaq; **to dance to *smb.*'s ~** başqasının çaldığına oynamaq

**tune**[2] [tju:n; tu:n] *v* 1. kökləmək *(musiqi alətini)*; **to ~ a guitar/a tar/a piano** gitara/tar/piano kökləmək; 2. *şair.* oxumaq; **to ~ a song** mahnı oxumaq; 3. qaydaya salmaq, düzəltmək; 4. uyğun olmaq/ gəlmək; **to ~ in** kökləmək *(radionu)*; **to ~ on a station** radiostansiyaya kökləmək *(radiocihazı)*; **to ~ up 1**) aləti kökləmək *(musiqiçi haq.)*; 2) çalmaq, oxumaq

**tuned** [tju:nd; tu:nd] *adj* köklənmiş, sazlanmış, köklü *(musiqi aləti haq.)*

**tuneful** [ˈtju:nfl; ˈtu:n-] *adj* 1. musiqiyə qabil, musiqi qabiliyyəti/duyumu olan; ~ **ear** musiqi duyumu olan qulaq; 2. melodik, ahəngdar; **a ~ choir of birds** quşların melodik/ahəngdar xoru *(bir yerdə oxuması)*

**tunefully** [ˈtju:nfəlı; tu:n-] *adv* harmonik, həmahəng, uyğun

**tunefulness** [ˈtju:nfəlnıs; ˈtu:n-] *n* ahəngdarlıq, həmahənglik, uyğunluq

**tuneless** [ˈtju:nlıs; ˈtu:n-] *adj* 1. qeyri-melodik; musiqi qabiliyyəti/duyumu olmayan; 2. batıq, boğuq *(səs haq.)*

**tuner** [ˈtju:nəʳ] *n* kökləyici *(musiqi alətlərini kökləyən usta)*

**tungsten** [ˈtʌŋtən] *n kim.* volfram *(çətin əriyən bərk metal)*

**tunic** [ˈtju:nık; ˈtu:-] *n* 1. jaket, kofta *(adətən kəmərli)*; 2. kitel *(hərbçilər üçün pencək)*; gimnastyorka *(hərbi biçimli üst köynəyi)*; mundir *(rəsmi paltar)*

**tuning** [ˈtju:nıŋ] *n* 1. kökləmə *(musiqi alətini, radionu)*; 2. *tex.* nizama/qaydaya salma *(mühərriki)*

**tuning-fork** [ˈtju:nıŋfɔ:k] *n* kamerton

**tuning-hammer** [ˈtju:nıŋ.hæməʳ] *n* simi kökləmək üçün açar

**tuning-key** ['tju:nıŋki:] *n* = **tuning-hammer**
**tunnel¹** ['tʌnl] *n* 1. tunel; **railway** ~ dəmiryol tuneli; *The train went into a tunnel Qatar tunelə girdi*; 2. baca, buxarı; 3. *tex.* boru kəməri
**tunnel²** ['tʌnl] *v* (-ll-) 1. tunel çəkmək; **to ~ a hill** dağdan tunel çəkmək; 2. tuneldən istifadə etmək; *The train tunnelled through the hill Qatar dağı tuneldən keçdi*
**tunny** ['tʌnı] *n zool.* tunes *(iri yırtıcı balıq)*
**Turanian¹** [tjuə'reınjən] *n* 1. *top.i dilç.* Ural-Altay dilləri; 2. Ural-Altay dillərindən birində danışan *(adam)*
**Turanian²** [tjuə'reınjən] *adj dilç.* Ural-Altay; ~ **languages** Ural-Altay dilləri
**turban** ['tə:bən] *n* 1. çalma, əmmamə, sarıq; 2. çalmayabənzər qadın papağı
**turbaned** ['tə:bənd] *adj* çalmalı, çalma geyinən, əmmaməli, əmmamə geyən
**turbid** ['tə:bıd] *adj* 1. bulanıq; **a ~ river** bulanıq çay; ~ **water** bulanıq su; 2. qatı, tünd; ~ **smoke** qatı tüstü; 3. dumanlı, anlaşılmaz, dolaşıq; aydın olmayan; ~ **thoughts** dumanlı/anlaşılmaz/dolaşıq fikirlər
**turbidity** [tə:'bıdıtı] *n* 1. bulanıqlıq; 2. qatılıq; 3. anlaşılmazlıq, dolaşıqlıq, qarışıqlıq
**turbine** ['tə:baın] *n tex.* turbin *(içərisində buxar, qaz və ya axar suyun enerjisi mexaniki qüvvəyə çevrilən mühərrik)*
**turbojet** [ˌtə:bou'dʒet] *adj tex.* turbo-reaktiv *(mühərrik haq.)*; ~ **engine** turbo-reaktiv mühərrik/ motor
**turbulence** ['tə:bjuləns] *n* 1. bulanıqlıq; qatılıq; 2. coşğunluq, qızğınlıq; 3. anlaşılmazlıq, dolaşıqlıq
**turbulent** ['tə:bjulənt] *adj* 1. şiddətli; güclü, coşğun, çılğın; ~ **waves** güclü/coşğun dalğalar; ~ **character** çılğın/coşğun xasiyyət; ~ **passions** coşğun ehtiraslar; 2. boranlı, tufanlı; ~ **weather** boranlı/tufanlı hava
**turbulently** ['tə:bjuləntlı] *adv* 1. coşğun, gurultulu, həyəcanla, qızğın surətdə; 2. narahatlıqla, narahat bir tərzdə
**tureen** [tju'ri:n, tə'ri:n] *n* sup qabı, şorba kasası
**turf¹** [tə:f] *n (pl* **turfs** *və ya* **turves** [tə:vz]) 1. çim; **soft** ~ yumşaq çim; **to lay** ~ çim döşəmək; 2. torf *(bataqlıqdan çıxarılan yanacaq)*
**turf²** [tə:f] *v* çimləmək, çimlə örtmək, çim döşəmək
**turf-bound** ['tə:fbaund] *adj* çimli, çimlə örtülmüş, çim döşənmiş
**turfen** ['tə:fn] *adj* 1. çimli, çim döşənmiş; 2. torf, torflu
**turgid** ['tə:dʒıd] *adj* 1. şişmiş, şiş, şişkin; ~ **buds** şişkin puçurlar/qönçələr; 2. təmtəraqlı, ibarəli; ~ **style/speech** təmtəraqlı üslub/nitq
**turgidity** [tə:'dʒıdıtı] *n* 1. şiş, şişkinlik; 2. təmtəraqlılıq, ibarəlilik *(nitq, üslub haq.)*
**Turk** [tə:k] *n* 1. türk; **the ~s** *top.i* türklər; 2. müsəlman

**turkey** ['tə:kı] *n* 1. *zool.* hinduşka; 2. *aşp.* hinduşka əti;
◊ **to talk** ~ *amer.* açıq danışmaq
**Turkey carpet** ['tə:kı'ka:pıt] *n* türk xalçası
**turkey-cock** ['tə:kıkɔk] *n* 1. hind xoruzu, erkək hinduşka; 2. lovğa/iddialı adam;
◊ **to strut/to swell like a ~** hind xoruzu/erkək hinduşka kimi qabarmaq; iddia/təşəxxüs satmaq, lovğalanmaq
**Turkey corn** ['tə:kı'kɔ:n] *n bot.* qarğıdalı
**turkey-hen** ['tə:kıhen] *n zool.* hind toyuğu
**turkey-poult** ['tə:kıpoult] *n zool.* hinduşka cücəsi/balası
**Turkic¹** ['tə:kık] *n* türk dilləri
**Turkic²** ['tə:kık] *adj* türk; ~ **languages** türk dilləri
**Turkish** ['tə:kıʃ] *n* türk dili; **to speak** ~ türk dilində/ türkcə danışmaq
**Turkish bath** ['tə:kıʃba:θ] *n* türk hamamı
**Turkish delight** ['tə:kıʃ'dılaıt] *n* rahətülhülqum
**Turkish towel** ['tə:kıʃˌtauəl] *n* xovlu məhrəba /dəsmal
**Turkman** ['tə:kmən] *n (pl* **-men** [-mən]) türkmən; **the Turkmen** *top.i* türkmənlər
**Turkoman** ['tə:kəmən] *n (pl* **-s** [-z]) 1. türk; 2. = **Turkman**; 3. türkmən dili
**turmoil** ['tə:mɔıl] *n* iğtişaş, şuluqluq, çaxnaşma, vəlvələ, təşviş; səs-küy, qarışıqlıq, hərc-mərclik, hay-küy, mərəkə; **racial** ~ irqi iğtişaş/çaxnaşma; *The country was in (a) turmoil during the strike Tətil dövründə ölkə çaxnaşma/iğtişaş içərisində idi*
**turn¹** [tə:n] *n* 1. dövr; **the ~ of a wheel** təkərin dövrü; 2. fırlanma, fırlanan hərəkət; **to give** *smth.* **a ~** bir şeyi fırlatmaq; 3. dönmə; döngə; **a ~ to the right/to the left** sağa/sola dönmə; *Right turn! Sağa dön/dönün! Left turn! Sola dön /dönün! About turn! Geriyə dön/dönün!*; **downhill /uphill** ~ dağaşağı/dağayuxarı döngə; yoxuşda /enişdə döngə *(xizək idmanında)*; **to make/to take a ~** dönmək; 4. dirsək; **a ~ in a river** çayda dirsək; **a path full of ~s and twists** əyri-üyrü yol; 5. istiqaməti dəyişmə; ~ **of the tide** *dən.* qabarma-çəkilmənin növbələşməsi; 6. dönmə nöqtəsi; başlanğıc; ~ **of the century** əsrin/yüzilliyin başlanğıcı; 7. dəyişmə *(vəziyyətdə)*; **a ~ for the better/for the worse** daha yaxşılığa/daha pisliyə doğru dəyişmə; *The patient has taken a turn for the better Xəstənin halı daha yaxşılaşıb*; **to take a bad ~** pis vəziyyət almaq; *Things have taken a dangerous turn İşlər təhlükəli vəziyyət alıb*; 8. burum, dolama; ~ **of a bandage** bintin bir burumu/dolaması; 9. növbə; **in ~(s), by ~s** növbə ilə; **to enter the room in ~(s)** otağa növbə ilə daxil olmaq; **to take ~s** növbəyə dayanmaq, növbə ilə etmək *(bir şeyi)*; *Now it's his turn to speak İndi danışmaq onun növbəsidir; My turn will come! Mənim də növbəm çatacaq, Mən də öz sözümü deyəcəm!* 10. qısa gəzinti,



başmaq seyri; **to take a ~/to go for a ~ in the garden** bağda gəzmək/ başmaq seyrinə çıxmaq; 11. qısa fəaliyyət müddəti; **a ~ of work** kiçik/qısamüddətli iş; **to take a ~ at gardening** bir az bağçılıqla məşğul olmaq, bir az bağda işləmək; 12. bacarıq, qabiliyyət *(ağılda, zəkada)*; **a serious ~ of mind** ağlın ciddiliyi; **to have a ~ for** *smth.* bir şeyə meyli/qabiliyyəti olmaq; *She is of a musical turn Onun musiqi qabiliyyəti var*; 13. forma, quruluş; **the ~ of an ankle** topuğun forması; **the ~ of the sentence** cümlənin quruluşu; *I don't like the turn of this sentence Bu cümlənin quruluşu mənim xoşuma gəlmir*; 14. *d.d.* partlayış, partlama, coşma, cuşa gəlmə, qızışma; **a ~ of anger** acığın coşması; 15. *pl* menstruasiya, aybaşı;
◊ **at every ~** hər addımda/yerdə; **to be on the ~** 1) dəyişmək, dəyişikliyə məruz qalmaq; 2) turşumaq, çürümək *(xüs. süd)*; **to do** *smb.* **a good ~** bir kəsə yaxşı xidmət etmək/göstərmək; **to do** *smb.* **a bad/an ill ~** bir kəsə pislik etmək/pis xidmət göstərmək; **not to do a hand's ~** ≅ qətiyyən əl tərpətməmək/vurmamaq; *One good turn asks another at. söz.* ≅ *Əl əli yuyar, əl də üzü*
**turn²** [tə:n] *v (əsas fel)* 1. çevirmək, döndərmək; **to ~ the leaves of a book** kitabın vərəqlərini çevirmək; **to ~ a key/a door-handle/a tap** açarı/qapı dəstəyini/ kranı döndərmək; *He turned the handle and the door opened O, dəstəyi döndərdi və qapı açıldı; He turned his chair to the fire O, stulunu ocağa tərəf çevirdi; Turn your eyes this way Gözünü/Gözünüzü bu tərəfə çevir/çevirin*; **to ~ one's head** başını çevirmək /döndərmək; *She turned her face to the speaker O, üzünü danışana/natiqə tərəf çevirdi*; 2. dönmək, çevrilmək; **to ~ in bed/in one's sleep** çarpayıda/yuxusunda çevrilmək; *The tap won't turn Kran çevrilmir;* 3. fırlatmaq, fırlandırmaq; **to ~ a wheel** təkəri fırlatmaq; **to ~ a handle** dəstəyi fırlatmaq; 4. fırlanmaq; *The earth turns round the sun Yer günəşin ətrafına fırlanır; The wheels were turning slowly Təkərlər yavaş-yavaş fırlanırdı; My head is turning Mənim başım fırlanır*; 5. eşmək, eşilmək; *His moustaches were turned Onun bığları eşilmişdi*; 6. yönəltmək, istiqamətləndirmək; **to ~ one's horse to the hills** atını dağa yönəltmək; 7. getmək, yönəlmək; **to ~ to the right/to the left** sağa/sola getmək/yönəlmək; 8. qovmaq; *They turned the man from their door Onlar kişini qapılarından qovdular*; 9. nişan almaq, tuşlamaq; **to ~ one's gun on** *smb.* silahını bir kəsə tuşlamaq; 10. dəf etmək; **to ~ an attack** hücumu dəf etmək; 11. dönmək, qayıtmaq; *The river turns here Çay burada dönür; It's time to turn if we want to get home in time Əgər biz evə vaxtında çatmaq istəyiriksə, qayıtmağın vaxtıdır*; 12. çevirmək, çevirtdirmək *(paltarı)*; *I must have my coat turned Mən paltomu çevirtdirməliyəm*; 13. yonmaq *(xarrat dəzgahında)*; yonulmaq *(xarrat dəzgahında)*; **to ~ well/easily** yaxşı/asan yonulmaq; 14. cəmləşdirmək, cəmləmək; **to ~ one's thoughts/one's attention to one's work** fikrini/diqqətini işinə cəmləşdirmək; 15. götür-qoy etmək *(məsələni, problemi və s.)*; **to ~** *smth.* **in one's head** bir şeyi başında götür-qoy etmək; 16. dəyişmək *(mövzunu)*; *When the girl entered the room, he turned to another subject Qız otağa daxil olduqda, o, söhbətin mövzusunu dəyişdi*; 17. tərcümə etmək, çevirmək *(başqa dilə)*; *How would you turn this passage? Bu parçanı sən/siz necə tərcümə edərsən?/edərsiniz? I can turn this book into English Mən bu kitabı ingilis dilinə tərcümə edə /çevirə bilərəm*; 18. dəyişmək, dəyişdirmək *(rəngi)*; *Her hair has begun to turn Onun saçının rəngi dəyişir (yəni çallaşır); The leaves are turning Yarpaqların rəngi dəyişir (yəni saralır)*; 19. dövriyyəyə buraxmaq *(pulu, malı)*; 20. xarab etmək, çürütmək; xarab olmaq, çürümək *(süd haq.)*; *The milk has turned Süd çürüyüb/ turşuyub*; 21. kütləşdirmək *(bıçağı və s.)*; **to ~ the edge of a knife** bıçağı kütləşdirmək; 22. şumlamaq, sürmək *(yeri)*; 23. toxumaq, hörmək *(corab və s.)*; **to ~ against** *smb./smth.* 1) bir kəsin/şeyin əleyhinə çıxmaq, bir kəsə/şeyə qarşı üsyan qaldırmaq; *The poor turned against the rich Kasıblar dövlətlilərə qarşı üsyan qaldırdılar*; 2) bir kəsə/şeyə qarşı çevrilmək; *His words turned against himself Onun sözləri özünə qarşı çevrildi*; **to ~** *smb.* **against** *smb./smth.* bir kəsi bir kəsə/bir şeyə qarşı qoymaq; *They turned his family against him Onlar onun ailəsini (onun) özünə qarşı qoydular*; **to ~ into/to** *smth.* bir şeyə çevrilmək; *Water turns into ice Su buza çevrilir; His love turned into/to hate Onun məhəbbəti nifrətə çevrildi*; **to ~ into** *smb.* bir kəsə çevrilmək, bir kəs olmaq; **to ~ into a criminal** cinayətkara çevrilmək, cinayətkar olmaq; **to ~** *smth.* **into** *smth.* bir şeyi bir şeyə çevirmək/ dəyişdirmək; *They turned their stock into cash Onlar səhmlərini pula çevirdilər/dəyişdirdilər*; **to ~ on/upon** *smth.* 1) bir şeydən asılı olmaq; *Great events often turn upon very small circumstances Böyük hadisələr çox vaxt lap kiçik vəziyyətlərdən asılı olur*; 2) ətrafında fırlanmaq, fikrini bir şeyə yönəltmək; **to ~ on/upon** *smb.* bir kəsin üstünə atılmaq; *In his anger he turned on me Hirs/Qəzəb içərisində o mənim üstümə atıldı; The dog turned on me and bit me İt üstümə atıldı və məni dişlədi/qapdı*; **to ~ to** *smth.* 1) bir şeyə müraciət etmək; **to ~ to the dictionary** lüğətə müraciət etmək; 2) girişmək, başlamaq *(bir işə)*, məşğul olmaq; **to ~ to painting/to music** şəkil çəkməklə/musiqi ilə məşğul olmaq; *He turned again to his work O, yenidən işinə girişdi/başla-*

*dı*; **to ~ to** ***smb.*** **for** ***smth.*** bir şey üçün bir kəsə müraciət etmək: **to ~ to the secretary for information** məlumat üçün katibə/katibəyə müraciət etmək; **to ~ to** ***smb.*** **for help/or advice** kömək üçün/məsləhət üçün bir kəsə müraciət etmək; **to ~** ***smb.*** **from** ***smth.*****/from doing** ***smth.*** bir kəsi bir şeydən /bir şey etməkdən daşındırmaq/çəkindirmək; *I turned him from his purpose Mən onu məqsədindən daşındırdım/ çəkindirdim*

**turn²** [tə:n] *v (bağlayıcı fel)* **1.** *İsimlə birləşərək olmaq mənası bildirir:* **to ~ soldier/cook/schoolmaster/traitor** əsgər/aşpaz/məktəb müəllimi/satqın olmaq; **to ~ Christian/Mohammedan** xristian/müsəlman olmaq; **2.** *Sifətlə birləşərkən bir vəziyyətdən başqa vəziyyətə keçməni bildirir və əksərən Azərbaycan türkcəsinə ayrıca sözlə tərcümə edilmir;* **to ~ green** göyərmək; **to ~ red** qızarmaq; **to ~ blue with cold** soyuqdan göyərmək; **to ~ red with anger** qəzəbdən qızarmaq; *The weather is turning colder Hava soyuqlaşır;* **to ~ aside 1)** rədd etmək, qəbul etməmək; **2)** kənara çıxmaq, uzaqlaşmaq *(mövzudan və s.)*; **to ~ away 1)** üz döndərmək /çevirmək; **2)** çevrilmək; çönmək, əlaqəni kəsmək; **to ~ away in disgust** nifrətlə üz döndərmək; **3)** ikrah yaratmaq; **4)** qovmaq, buraxmamaq; *He turned the boy away from his door O, oğlanı qapısından qovdu;* **5)** vəzifədən/işdən qovmaq; **to ~ back 1)** geri oturtmaq, geri oturmağa/çəkilməyə məcbur/vadar etmək; **to ~ the enemy back** düşməni geri çəkilməyə məcbur etmək; **2)** geri dönmək/çəkilmək; **3)** dönmək, üzünü/başını çevirmək; **4)** qatlamaq *(paltarın ətəyini və s.)*; **to ~ down 1)** azaltmaq *(işığı, qazı)*; **2)** azalmaq *(işıq, qaz haq.)*; **3)** çevirmək; **to ~ down** ***one's*** **coat collar** paltosunun yaxalığını çevirmək; **4)** rədd etmək, qəbul etməmək *(təklifi)*; **5)** döndərmək, dönmək; **to ~ down a narrow road** dar yola döndərmək/ dönmək; **to ~ in 1)** qıvrılmaq; **2)** yolüstü/ ayaqüstü baş çəkmək; **3)** *d.d.* yatmaq; **4)** *k.t.* şumlamaq, sürmək *(torpağı)*; **to ~ inside out 1)** tərs üzünə/ tərsinə çevirmək; *The wind turned my umbrella inside out Külək mənim çətirimi tərs üzünə çevirdi;* **2)** tərs üzünə çevrilmək; *My umbrella turned inside out Mənim çətirim tərs üzünə çevrildi;* **to ~ off 1)** söndürmək, şəbəkədən ayırmaq *(radionu, işığı və s.)*; **2)** bağlamaq *(kranı)*; **3)** qovmaq, işdən çıxartmaq; **to ~ off workmen** fəhlələri işdən qovmaq/işdən çıxartmaq; **4)** diqqəti yayındırmaq; **5)** xarab olmaq *(yemək)*; **6)** solub tökülmək *(yarpaq haq.)*; **to ~ on 1)** qoşmaq, işə salmaq, qurmaq *(radionu və s.)*; **2)** yandırmaq, qoşmaq *(işığı)*; **3)** açmaq *(kranı)*; **to ~ on the waterworks** *d.d.* ağlamaq, ağlamağa başlamaq; **to ~ out 1)** söndürmək *(işığı, qazı)*; **2)** çevirmək; **to ~ out** ***one's*** **pockets** ciblərini çevirmək; **3)** qovmaq, çıxartmaq; **4)** işi dayandırmaq, tətil etmək; **5)** istehsal etmək; **to ~ out beautiful fabrics** gözəl parçalar istehsal etmək; **6)** geyinmək, bəzənmək; *She's beautifully turned out O, gözəl geyinmişdi;* **7)** yığışmaq, gəlmək; *How many people turned out for the meeting? İclasa neçə adam gəlmişdi?* **8)** çağırmaq; **to ~ out guard** keşikçi çağırmaq; **9)** qalxmaq *(yataqdan)*; **to ~ over 1)** çevirmək; **to ~ over the pages of a book** kitabın səhifələrini çevirmək; **2)** eşələnmək, çevrilmək; *He turned over and over in his bed O, yatağında hey çevrildi/eşələndi; The car turned over Maşın çevrildi;* **3)** astarını üzünə çevirmək; **4)** fikirləşmək, götür-qoy etmək; *He turned the matter over and over in his mind O, bu məsələni başında götür-qoy etdi;*

◊ **to ~** ***one's*** **ankle** topuğunu burxutmaq; **to ~ the blind eye to** ***smth.*** bir şeyə göz yummaq; **to ~ a deaf ear** qulaq asmamaq, qulaqardına vurmaq; **to ~ up** ***one's*** **heels/toes** ölmək; **to ~** ***one's*** **coat** əqidəsini dəyişmək, başqa partiyaya keçmək; **to ~ the corner** çətin/təhlükəli vəziyyətdən çıxmaq

**turnabout** [ˈtə:nəbaut] *n* **1.** döngə; **2.** mövqeyin/baxışın və s. dəyişməsi; başqa tərəfə keçmə; **3.** *amer.* karusel

**turnback** [ˈtə:nbæk] *n* qorxaq/ağciyər adam

**turncoat** [ˈtə:nkout] *n* **1.** xain, dönük, mürtəd; **2.** *hərb.* fərari, düşmən tərəfinə keçən *(adam)*; düşmənə satılmış adam

**turn-down¹** [ˈtə:ndaun] *n* **1.** qatlama yaxalıq /cib /manjet; **2.** *d.d.* rədd etmə; boyun qaçırma, imtina etmə

**turn-down²** [ˈtə:ndaun] *adj* **1.** qatlama; **a ~ collar** qatlama boyunluq; **2.** qatlanan; **a ~ bed** qatlanan çarpayı, raskladuşka

**turner** [ˈtə:nəʳ] *n* **1.** tokar; xarrat; **2.** dulusçu; **3.** gimnast

**turnery** [ˈtə:nərı] *n* **1.** tokar/xarrat sənəti; **2.** tokar/xarrat emalatxanası; **3.** tokar/xarrat məmulatı

**turn-in** [ˈtə:nın] *n d.d.* kassaya qaytarılmış bilet *(teatr bileti və s.)*

**turning¹** [ˈtə:nıŋ] *n* **1.** döngə *(yolda, küçədə)*; *Take the first turning to/on the right/the left Birinci döngədən sağa/sola dön/dönün;* **2.** dörd yol ağzı; **to stop at the next ~** növbəti dörd yol ağzında dayanmaq; **3.** döngə *(çayda)*; **4.** hərlənmə, fırlanma, dolanma; **5.** dönmə, çevrilmə; **6.** dəyişmə, kənara çıxma *(hərəkət və s.)*; **to take the wrong ~** *məc.* doğru yoldan çıxmaq/sapmaq; **7.** gimnastika; **8.** bükük, büküş, büzmə, qırçın, qat *(paltarda)*

**turning²** [ˈtə:nıŋ] *adj* **1.** xarrat; **a ~ lathe** xarrat dəzgahı; **2.** fırlanan, dolanan, hərlənən; **a ~ bridge** fırlanan/hərlənən körpü; **3.** növbələşən, dəyişən; **~ seasons** növbələşən fəsillər *(ilin)*

**turning-point** [ˈtə:nıŋpɔınt] *n* **1.** dönüş nöqtəsi; həlledici an; **the ~s of history** tarixin dönüş nöqtələri; **the ~ in the negotiations** danışıqlarda dönüş nöqtəsi/həlledici an; **2.** böhran; dönüş; **the ~ of a disease** xəstəliyin dönüşü



**turnip** [ˈtə:nıp] *n bot.* **1.** şalğam; **2.** şalğamdan hazırlanmış xörək; **3.** gic, axmaq, sarsaq, korazehin, qanmaz

**turnout** [ˈtə:naut] *n* **1.** tamaşaya/iclasa/yarışa gələn adamların sayı, adamlar, camaat, kütlə; *There was a good/low turnout at the yesterday's meeting Dünənki iclasda çox/az adam iştirak edirdi;* **2.** geyim, paltar; *The teacher praised the children for their neat turn-out Müəllim uşaqları səliqəli geyimlərinə görə təriflədi;* **3.** təmizləmə, boşaltma *(otağı, siyirmə və s.)*; *These drawers are full of rubbish – It's time I had a good turn-out Bu siyirmələr yararsız şeylərlə doludur – mən onları təmizləməliyəm/ boşaltmalıyam;* **4.** tətil; **general/ long ~** ümumi/uzunmüddətli tətil; **5.** tətilçi; **6.** qalxma, durma *(yataqdan)*

**turnover** [ˈtə:nouvəʳ] *n* **1.** devirmə, çevirmə, yıxma; **2.** o biri səhifəyə keçən qəzet məqaləsi; **3.** içi doldurulmuş yarımgirdə piroq; **4.** *iqt.* dövriyyə, tədavül; **~ of capital** kapital dövriyyəsi/tədavülü; **5.** axın; axın ölçüsü *(fəhlə qüvvəsinin)*; **labour ~** fəhlə qüvvəsinin axını; **6.** çevirmə, döndərmə *(güləşdə)*; **~ with body/with leg** bədəndən/ayaqdan tutaraq çevirmə

**turnpenny** [ˈtə:nˌpenı] *n* tamahkar/acgöz adam

**turnpike** [ˈtə:npaık] *n* **1.** *(həm də* **~ road)** şose, magistral, əsas yol; **2.** göl zastavası/qarovulxanası

**turn-screw** [ˈtə:nskru:] *n* vintaçan, vintburan

**turnspit** [ˈtə:nspıt] *n* **1.** şiş; **2.** kababçı, kabab bişirən *(adam)*

**turnstile** [ˈtə:nstaıl] *n* turniker *(adamları bir-bir növbə ilə buraxmaq üçün bir yerin girəcəyində qoyulan fırlanan çarpaz qapı)*

**turpitude** [ˈtə:pıtju:d; -tu:d] *n* **1.** qüsurluluq, nöqsanlılıq, eyiblilik; əxlaqsızlıq; **2.** alçaqlıq, rəzillik, əclaflıq; **3.** rüsvayçılıq, biabırçılıq, bədnamlıq, üzüqaralıq

**turquoise¹** [ˈtə:kwɔız] *n* **1.** firuzə *(qiymətli daş)*; **2.** firuzə rəngi; **the ~ of the heavens** göylərin firuzə rəngi

**turquoise²** [ˈtə:kwɔız] *adj* firuzə, firuzəyi, firuzə rəngli; **a ~ dress** firuzə rəngli paltar

**turret** [ˈtʌrıt] *n* **1.** kiçik bürc, qalaça; **the ~s of an ancient chateau** qədim qəsrin bürcləri/ qülləələri; **2.** *hərb.* zirehli qüllə, top qülləsi; **3.** *tex.* revolver dəzgahı *(təkmilləşdirilmiş tokar dəzgahı)*

**turreted** [ˈtʌrıtıd] *adj* bürclü; **a ~ castle** bürclü qəsr

**turtle** [tə:tl] *n* **1.** tısbağa, çanaqlı bağa; **2.** tısbağa əti; **3.** tısbağa ətindən bişirilmiş şorba/sup;

◊ **to turn ~** çevrilmək, arxası üstə düşmək/ çevrilmək *(gəmi, avtomobil və s. haq.)*

**turtle-dove** [ˈtə:tldʌv] *n* **1.** *zool.* çölgöyərçini; **2.** sevgili, canan; **3.** qırmızı-boz rəng

**turtle-neck** [ˈtə:tlnek] *n* **1.** hündür qatlanmış yaxalıq *(sviterdə)*; **2.** hündür yaxalıqlı sviter *(həm də* **~ sweater)**

**tusk** [tʌsk] *n* **1.** diş *(qabanda, fildə və s.)*; **2.** *k.t.* gavahın *(kotanda)*

**tussle¹** [ˈtʌsl] *n* mübahisə, dava, dava-dalaş, qızğın mübahisə; söyüşmə; **to have a ~ with** ***smb.*** **for** ***smth.*** bir kəslə bir şeyə görə qızğın mübahisə etmək

**tussle²** [ˈtʌsl] *v* mübarizə/mübahisə etmək; dalaşmaq; **to ~ with** ***smb.*** bir kəslə mübahisə etmək/dalaşmaq

**tussock** [ˈtʌsək] *n* **1.** kom/topa halında bitmiş ot; **2.** torpaq koması/topası, iri kəsək, təpəcik; **3.** zəncirotu

**tut¹** [tʌt] *(həm də* **tut-tut** [ˌtʌtˈtʌt] *n* nırç; **to give a ~** nırçıldamaq *(narazılıq əlaməti olaraq)*

**tut²** [tʌt] **(-tt-)** *(həm də* **tut-tut** [ˌtʌtˈtʌt] *v* nırçıldamaq *(narazılıq əlaməti olaraq)*

**tut³** [tʌt] *interj. d.d. Kəs səsini! Adam ol!*

**tutelage** [ˈtju:təlıdʒ; ˈtu:-] *n* **1.** qəyyumluq, himilik, himayə; **2.** qəyyumluqda/himayə altında olma; **to be in ~** himayədə olmaq; **3.** həddi-büluğa çatmama; uşaqlıq, uşaqlıq yaşları; **4.** oxuma, təhsil alma; təhsil; **to be under the ~ of different masters** müxtəlif müəllimlərdən təhsil almaq

**tutor¹** [ˈtju:təʳ; ˈtu:-] *n* **1.** evdə dərs deyən müəllim; repetitor; müəllim; **private ~** xüsusi repetitor; **2.** tələbə qrupunun rəhbəri *(ingilis universitetlərində)*; **3.** *amer.* ali məktəb müəllimi; **4.** *hüq.* hami, qəyyum

**tutor²** [ˈtju:təʳ; ˈtu:-] *v* **1.** xüsusi dərs demək; **2.** öyrətmək; **to ~ a pupil in Latin** şagirdə latın dili öyrətmək; **3.** rəhbərlik etmək; öyüd-nəsihət vermək

**tutorial¹** [tju:ˈtɔ:rıəl; ˈtu:-] *n* **1.** məsləhət saatı, konsultasiya, rəhbərlə görüş; **2.** kollecdə təhsil alma müddəti

**tutorial²** [tju:ˈtɔ:rıəl; ˈtu:-] *adj* **1.: ~ system** tələbələri müəllimlərə/rəhbərlərə təhkim etmə sistemi *(universitetlərdə)*; **2.** qəyyumluq, qəyyum

**tutorship** [ˈtju:təʃıp; ˈtu:-] *n* **1.** müəllim/mürəbbi vəzifəsi; **2.** müəllimin/mürəbbinin borcu; **3.** qəyyumluq, hamilik

**tutti-frutti** [ˌtu:tı:ˈfru:tı] *n (pl* **-fruttis) 1.** meyvəli dondurma; **2.** şəkərli meyvə

**tu-whit** [tuˈwıt] *n* **1.** bayquşun ulaması; **2.** bayquşun ulamasını təqlid etmə

**tu-whoo** [ˈtuwu:] *v* bayquşun ulamasını təqlid etmək

**twaddle¹** [ˈtwɔdl] *n* cəfəngiyyat, laqqırtı, mənasız/axmaq söz, boş danışıq; **to talk mere ~** boş-boş danışmaq, laqqırtı vurmaq

**twaddle²** [ˈtwɔdl] *v* boşboğazlıq/gəvəzəlik/naqqallıq/lağlağılıq etmək, boş-boş/cəfəngiyyat danışmaq

**twaddler** [ˈtwɔdləʳ] *n* boşboğaz, gəvəzə, naqqal, çoxdanışan *(adam)*

**twang[1]** [twæŋ] *n* **1.** dınqıltı *(tarım çəkilmiş simin və s. səsi)*; **the ~ of a guitar** gitaranın dınqıltısı; **2.** tın-tın/ burnunda danışma; **to speak with a ~** tın-tın/burnunda danışmaq

**twang[2]** [twæŋ] *v* **1.** dınqıldatmaq, dınqıldamaq; *Someone was twanging a guitar in the next room Kimsə o biri otaqda gitara dınqıldadırdı*; **2.** tın-tın/ burnunda danışmaq; **3.** yay ipini dartmaq *(kamanın)*

**twat** [twɔt, twæt] *n* **1.** cinsi orqan *(qadınlarda)*; **2.** gic/ sarsaq adam, gicdıllaq

**tweak[1]** [twi:k] *n* çimdik, çimdikləmə, çimdik götürmə; **to give smb. a ~** bir kəsi çimdikləmək; *He gave the boy a tweak O, oğlanı çimdiklədi*

**tweak[2]** [twi:k] *v* çimdikləmək, çimdik götürmək; **to ~ a child's ears** uşağın qulaqlarından dartmaq/çəkmək

**twee** [twi:] *adj d.d.* zərif, incə, gözəl, qəşəng

**tweed** [twi:d] *n* **1.** tvid *(parça növü)*; **2.** *pl* tviddən tikilmiş paltar

**tweedy** ['twi:dı] *adj* tvid, tviddən tikilmiş; **~ jackets** tvid/tviddən tikilmiş pencəklər

**tweet[1]** [twi:t] *n* civilti, cikkilti, cəh-cəh *(quşlarda)*

**tweet[2]** [twi:t] *v* **1.** civildəmək, cikkildəmək, cəh-cəh vurmaq *(quşlar haq.)*; **2.** cırıldamaq *(kibrit)*

**tweeter** ['twi:tə'] *n* uca səs tonu vermək üçün kiçik/balaca reproduktor *(səsucaldan cihaz)*

**tweezer** ['twi:zə'] *v* maqqaşla/kəlbətinlə qırpıb qopartmaq

**tweezers** ['twi:zəz] *n (cəm formalı fellə işlənir)* maqqaş, kəlbətin *(həm də* **a pair of ~***)*

**twelfth[1]** [twelfθ] *n* **1.** **(the ~)** on ikinci rəqəm; **on the ~ of May** mayın on ikisində; **2.** on ikinci hissə; **five ~s** on ikidə beş

**twelfth[2]** [twelfθ] *num* on ikinci; *He came twelfth O, on ikinci gəldi*;

◊ **Louis the Twelfth** on ikinci Lüdovik

**twelve** [twelv] *num.* **1.** on iki *(rəqəm)*; *Twelve and twelve make twenty-four On iki üstəgəl on iki iyirmi dörd eylər; There were twelve children in the garden Bağda on iki uşaq vardı*; **2.** on ikinci; **chapter ~** on ikinci fəsil; **Room ~** on ikinci otaq; **3.** on iki yaş; *He is twelve O, on iki yaşındadır*; **at ~** on iki yaşında; **4.** saat on iki; *She'll come at twelve O, saat on ikidə gələcək*

**twelvefold[1]** ['twelvfould] *adj* **1.** on iki dəfə çox, on iki dəfə çoxaldılmış; **2.** on iki hissədən ibarət; **3.** on iki dəfə

**twelvefold[2]** ['twelvfould] *adv* on iki dəfə çox

**twelvemonth** ['twelvmʌnθ] *n arx.* il

**twenties** ['twentız] *n pl* **1.** iyirmidən iyirmi doqquza qədər olan rəqəmlər; **2.** **the ~** iyirminci illər; **3.** iyirmidən iyirmi doqquza qədər olan yaş; *She is in the early/in the late twenties Onun yaşı iyirmidən artıqdır/iyirmi beşdən artıqdır*

**twentieth[1]** ['twentııθ] *num* **1.** iyirminci *(rəqəm)*; **on the ~ of May** mayın iyirmisində; **2.** iyirminci hissə; **three ~s** iyirmidə üç

**twentieth[2]** ['twentııθ] *adj* iyirminci; **the ~ chapter/ page** iyirminci fəsil/səhifə

**twentieth[3]** ['twentııθ] *adv* iyirminci; *He came twentieth O, iyirminci gəldi*

**twenty** ['twentı] *num.* **1.** iyirmi; **~ children** iyirmi uşaq; **2.** iyirminci; **chapter ~** iyirminci fəsil; **Room ~** iyirminci otaq; **3.** iyirmi yaş; *He is twenty O, iyirmi yaşındadır; He is getting on for twenty O tezliklə iyirmi yaşa çatacaq*; **a girl of ~** iyirmi yaşlı qız;

◊ **~ and ~ times** min dəfələrlə, sonsuz olaraq

**twentyfold[1]** ['twentıfould] *adj* iyirmi dəfə böyük, iyirmiyə vurulmuş, iyirmiqat

**twentyfold[2]** ['twentıfould] *adv* iyirmi dəfə çox, iyirmiqat artıq

**twice** [twaıs] *adv* **1** iki dəfə; *Twice two is four İki dəfə iki dörd eylər/dörddür*; **to do smth. ~** bir şeyi iki dəfə etmək; *I've already seen this film twice Mən bu filmi artıq iki dəfə görmüşəm*; **2.** ikiqat; **~ as good/as much** ikiqat yaxşı/çox;

◊ **once or ~, ~ or thrice** bir neçə dəfə; **in ~ 1)** iki dəfəyə; **to pay a debt in ~** borcu iki dəfəyə ödəmək; **2)** ikinci dəfə; **to succeed in ~** ikinci dəfə nailiyyət/müvəffəqiyyət qazanmaq; **to think ~ before doing smth.** bir işi görməzdən əvvəl yaxşı-yaxşı fikirləşmək/götür-qoy etmək

**twice-born** ['twaısbɔ:n] *adj* başqa cür ifadə edilmiş, başqa şəklə salınmış/düşmüş; tamamilə başqalaşmış /yeniləşmiş

**twice-told** [ˌtwaıs'tould] *adj* **1.** iki dəfə danışılmış/tutuşdurulmuş/yoxlanılmış; **2.** məlum, çeynənmiş, köhnə; **~ tale** köhnə əhvalat

**twiddle[1]** ['twıdl] *n* **1.** hərlətmə, fırlatma; **2.** buruq, burum, qıvrım *(saçda, naxışda, yazıda və s.)*; **3.** cəh-cəh, zəngulə; səsin titrəməsi/əsməsi

**twiddle[2]** ['twıdl] *v* **1.** hərlətmək, fırlatmaq, eşmək, oynatmaq *(məqsədsiz)*; **to ~ one's moustache** bığını eşmək/fırlatmaq/oynatmaq; **to ~ with the watch-chain** saat zəncirini fırlatmaq/oynatmaq; **2.** avara/boş-bikar/avara-avara gəzmək, veyllənmək; **3.** əsmək, titrəmək *(səs haq.)*;

◊ **to ~ one's thumbs/one's fingers** tənbəllik etmək, veyllənmək; səmərəsiz işlə məşğul olmaq

**twig[1]** [twıg] *n* **1.** çubuq, çırpı, çör-çöp, şax; **willow ~s** söyüd çubuğu/çırpısı; **to use dry ~s to start a fire** ocaq qalamaq üçün quru çör-çöpdən istifadə etmək; **2.** şüvül

**twig[2]** [twıg] *v* (-gg-) **1.** *d.d.* başa düşmək, anlamaq; *He soon twigged their game O tezliklə onların niyyətini başa düşdü*; **2.** müşahidə/hiss etmək, göz yetirmək, görmək; *The hunter twigged an animal in front of him Ovçu qabağında/ qarşısında bir heyvan olduğunu hiss etdi/gördü*

**twiggy** ['twıgı] *adj* **1.** zərif, zəif, nazik, təzsınan; **~ legs** zərif baldırlar; **2.** budaqlı, şaxəli, qollu-budaqlı; **~ trees** şaxəli/qollu-budaqlı ağaclar

~~**twilight[1]** ['twaılaıt] *n* **1.** toran; **evening ~** axşam~~ toranı; *I couldn't see their faces clearly in the twilight Mən toranda onların üzünü aydın görə bilmədim*; **2.** toran vaxtı; **a walk along the beach at ~** toran vaxtında çimərlik boyu gəzinti; **3.** tənəzzül dövrü; **the ~ of Soviet Empire** Sovet imperiyasının tənəzzül dövrü



**twilight[2]** ['twaılaıt] *adj* **1.** toran; **~ hours** toran saatları/ vaxtı; **2.** dolaşıq, qarışıq, aydın olmayan; **~ thoughts** aydın olmayan/qarışıq fikirlər

**twilit** ['twaılıt] *adj* toran; zəif işıqlandırılmış; **in the ~ room** zəif işıqlandırılmış otaqda

**twill[1]** [twıl] *n toxuc.* sarja *(astarlıq üçün parça)*

**twill[2]** [twıl] *v* sarja istehsal etmək/toxumaq

**twin[1]** [twın] *n* **1.** ekiz, əkiz; **a pair of ~s** *d.d.* ekizlər; **Siamese ~s** Siam əkizləri; **2.** oxşar *(bir-birinə oxşayan iki nəfərdən biri, bir adamın oxşarı)*; **3.** qoşa/cüt şey; **4.** tay; *The plate was one of a pair, but I broke its twin Boşqab cüt idi, lakin mən onun tayını sındırdım*

**twin[2]** [twın] *adj* **1.** ekiz; **my ~ brother/sister** mənim ekiz qardaşım/bacım; **~ lambs** ekiz quzular; **2.** oxşar, eynitipli; **~ tasks** oxşar tapşırıqlar; **~ houses** eynitipli evlər; **3.** qoşa, cüt; **a ship with ~ propellers** qoşa propellerli gəmi

**twin[3]** [twın] *v* (-nn-) **1.** ekiz/əkiz doğmaq; **2.** birləşdirmək

**twin-born** ['twınbɔ:n] *adj* ekiz/əkiz doğulmuş

**twin-brothers** [ˌtwın'brʌðəz] *n* ekiz/əkiz qardaşlar

**twine[1]** [twaın] *n* **1.** buraz, kəndir, ip; **2.** soluxmuş saplaq; **3.** halqa *(ilan haq.)*; **4.** ilgək; **5.** eşmə, toxuma, hörmə

**twine[2]** [twaın] *v* **1.** eşmək, burmaq, hörmək; sarımaq, dolamaq; **to ~ thin threads into a rope** nazik sapı eşib kəndir düzəltmək; **to ~ flowers into a wreath** çiçəklərdən çələng hörmək; **to ~ one's arms around/about smb.'s neck** qollarını bir kəsin boynuna dolamaq; *She twined her arms around my neck O, qollarını mənim boynuma doladı*; **2.** dolanmaq, sarmaşmaq; *The ivy twined round the tree Sarmaşıq ağaca dolandı/sarmaşdı*; **3.** tutuşmaq, yapışmaq *(güləşdə)*; **4.** dolanmaq, burulmaq *(çay, yol haq.)*; **5.** qıvrılmaq, dolanmaq *(ilan haq.)*

**twin-engine** [ˌtwın'endʒın] *adj* = **twin-engined**

**twin-engined** [ˌtwın'endʒınd] *adj* ikimühərrikli, ikimotorlu

**twiner** ['twaınə'] *n* **1.** sarılan/sarmaşan bitki; **2.** *toxuc.* eşmə maşını/dəzgahı

**twinge[1]** [twındʒ] *n* **1.** kəskin qəfil ağrı; **to get ~s of rheumatism** revmatizmdən kəskin qəfil ağrı hiss etmək; **a ~ of toothache** kəskin qəfil diş ağrısı; **2.** əziyyət, əzab; **the ~s of conscience** vicdan əzabı

**twinge[2]** [twındʒ] *v* **1.** tutma/qəfil ağrı hiss etmək; **2.** tutma ağrısı törətmək, ağrıya səbəb olmaq, əziyyət vermək; *Compunction twinged him Peşmançılıq ona əziyyət verdi*

**twingle-twangle** ['twıŋgl'twæŋgl] *n* dınqıltı, sim səsi

**twining** ['twaınıŋ] *adj* sarmaşan; **~ plants** sarmaşan bitkilər

**twink[1]** [twıŋk] *n* **1.** sayrışma, parlama; **2.** *məc* an, qırpım, göz qırpımı, ləhzə; **in a ~** bir anda/göz qırpımında/ ləhzədə

**twink[2]** [twıŋk] *v* sayrışmaq, parlamaq

**twinkle[1]** ['twıŋkl] *n* **1.** sayrışma, titrək işıq vermə, parıldama, parlama; **the ~ of stars** ulduzların sayrışması/ parıldaması; **2.** yanıb/parlayıb sönmə; **3.** an, qırpım, göz qırpımı, ləhzə; **in a ~** bir anda/ ləhzədə; **in the ~ of an eye** bir göz qırpımında

**twinkle[2]** ['twıŋkl] *v* **1.** parıldamaq, parlamaq, sayrışmaq; *Stars twinkle in the sky Ulduzlar səmada sayrışır; The light of a big town twinkled in the distance Böyük şəhərin işıqları uzaqda parlayırdı/ sayrışırdı; His eyes twinkled with joy Onun gözləri sevincdən parladı*; **2.** cəld hərəkət etmək; *The dancer's feet twinkled Rəqqasənin ayaqları cəld hərəkət etdi*; **3.** işıq vermək; **4.** işıq siqnalı ilə məlumat vermək

**twinkling** ['twıŋklıŋ] *n* **1.** an, bir an, bir göz qırpımı, ləhzə; **in a ~** bir anda/ləhzədə; **the ~ of an eye** bir göz qırpımı; **2.** yanıb/parlayıb sönmə, sayrışma; görünüb tez yox olma; **3.** sayrışma *(ulduz haq.)*

**twinned** [twınd] *adj* **1.** əkiz/ekiz doğulmuş; **2.** birləşdirilmiş, əlaqələndirilmiş

**twin-sisters** ['twınsıstəz] *n* əkiz bacılar

**twirl[1]** [twə:l] *n* **1.** fırlanma, hərlənmə, burulma; **2.** qasırğa, burağan; **dust ~** toz burağanı; **3.** buruq, burum, quyruq *(imzada, hərfdə, saçda və s.)*

**twirl[2]** [twə:l] *v* **1.** fırlamaq, hərləmək, eşmək, burmaq; **to ~ one's moustache** bığını burmaq /eşmək; **2.** fırlanmaq, hərlənmək, burulmaq, eşilmək; *The compass needle twirled swiftly round Kompasın əqrəbi cəld fırlandı*;

◊ **to ~ one's thumbs** tənbəllik etmək, boş-boşuna oturmaq

**twist[1]** [twıst] *n* **1.** burma, eşmə; burulma, eşilmə; **to give a ~** eşmək, əymək, sarımaq; **to give a ~ to a rope** kəndiri eşmək/burmaq; **to give a ~ to smb.'s arms** bir kəsin qollarını burmaq; **2.** döngə, dirsək; **a ~ in a road** yolda döngə; **3.** düyün, ilgək; **a rope full of ~s** düyünlə dolu kəndir; **4.** tvist *(rəqs növü)*; **5.** eşmə *(kəndiri, sapı və s.)*; **6.** sapma, kənara çıxma *(həm də məc.)*; **the ~ of a billiard ball** bilyard şarının sapması; **a ~ toward the new policy** yeni siyasətə keçid; **7.** təhrif *(fikirdə)*; **8.** xüsusiyyət, səciyyə *(ağılda, xasiyyətdə və s.)*; **9.** burxuq; **to give one's knee a bad ~** ayağını bərk burxutmaq; **10.** yalan;

◊ **~ of the wrist** cəldlik, çeviklik, əlin cəldliyi/ çevikliyi; **~s and turns** təfərrüatlar, incəliklər

**twist[2]** [twıst] *v* **1.** burmaq, eşmək, hörmək, əyirmək; **to ~ a thread** sap eşmək; **to ~ flowers**

into a wreath güllərdən çələng hörmək; to ~ a yarn iplik əyirmək; 2. əyilmək, burulmaq, eşilmək; dolanmaq; dolaşmaq; *The road twists a good deal Yol xeyli/çox burulur*; 3. güclə yol tapmaq; istiqaməti dəyişmək; *We twisted our way through the crowd Biz izdihamın içindən özümüzə güclə yol tapdıq*; 4. burmaq *(qolu)*, basmaq; to ~ *smb.'s* arm 1) bir kəsin qolunu burmaq *(cəza olaraq)*; 2) *d.d.* məcbur/vadar etmək; 5. sıxmaq *(yuyulmuş paltarı)*; 6. əzmək; *He fell and twisted his knee O yıxıldı və dizini əzdi*; 7. əymək *(üzünü)*; *Her face was twisted with pain Ağrıdan onun üzü əyildi*; 8. təhrif etmək, mənasını dəyişdirmək; to ~ *smb.'s* words bir kəsin sözünü təhrif etmək/ sözünün mənasını dəyişdirmək; 9. fırlamaq, hərləmək, döndərmək; to ~ a shaft dəstəyi fırlamaq; 10. sarımaq, dolamaq; to ~ silk thread on a reel ipək sapı tağalağa sarımaq; to ~ a muffler round *one's* neck şərfi boğazına dolamaq; 11. *d.d.* aldatmaq; to ~ about qovrulmaq, qıvrılmaq, çəng olmaq *(ağrıdan)*; *He was twisting about in pain O, ağrı içində qovrulurdu/qıvrılırdı*; to ~ off sındırmaq, qoparmaq; to ~ a piece of wire bir parça məftil qoparmaq; to ~ out sürüşüb çıxmaq; *The boy twisted out of her arms and ran away Oğlan sürüşüb onun qolları arasından çıxdı və qaçıb getdi*

**twisted** ['twɪstɪd] *adj* 1. hörülmüş, eşilmiş, toxunmuş; 2. əyilmiş; 3. əyri, əyri-üyrü, dolanbac; a ~ road əyri-üyrü yol; 4. dolaşıq, dolaşıq salınmış, dolaşdırılmış, qarışıq

**twister** ['twɪstəʳ] *n* 1. yalançı; 2. əyirici, əyirən *(adam)*; 3. əyirici maşın; 4. mahmız; 5. *amer.* tufan, qasırğa, burağan *(tropik ölkələrdə)*; 6. fırıldaqçı, hiyləgər, dələduz

**twisting** ['twɪstɪŋ] *n* 1. eşmə, burma; 2. *id.* fırlatma; ~ of the body bədəni/gövdəni fırlatma

**twisty** ['twɪstɪ] *adj* 1. əyri-üyrü, dolanbac; ~ river əyri-üyrü çay; a ~ road dolanbac yol; 2. namussuz, şərəfsiz, prinsipsiz; a ~ politician şərəfsiz/prinsipsiz siyasətçi; 3. qeyri-səmimi, ikimənalı, fəndgir, hərif

**twit**[1] [twɪt] *n* 1. danlaq, məzəmmət, qınama, tənə; 2. istehza, masqara, ələ salma, lağa qoyma, rişxənd, acı/kəskin irad

**twit**[2] [twɪt] *v* (-tt-) 1. danlamaq, məzəmmət etmək; qınamaq, başına qaxmaq, təqsirləndirmək; to ~ a person with/about his conduct hərəkətinə/davranışına görə bir kəsi danlamaq/qınamaq; 2. rişxənd etmək, masqaraya /lağa qoymaq, cırnatmaq, ələ salmaq

**twitch**[1] [twɪtʃ] *n* 1. dartma, çəkmə; kəskin dartılan hərəkət; to give a ~ at *smb.'s* arm bir kəsin qolundan dartmaq/çəkmək; 2. dartılma; qıc, qıc olma; 3. ilgək, ilmə

**twitch**[2] [twɪtʃ] *v* 1. çəkmək, dartmaq; to ~ *smb.* by the hand bir kəsin əlindən dartmaq; 2. şəkləmək; *The horse twitched his ears At qulaqlarını şəklədi*; 3. dartılmaq; *His face twitched with pain Onun sifəti ağrıdan dartıldı*; 4. çimdikləmək, çimdik götürmək; didmək, yolmaq

**twitter**[1] ['twɪtəʳ] *n* 1. civilti, cikkilti; ~ of birds quşların civiltisi/cikkiltisi; 2. cəfəngiyyat, boşboğazlıq, boş danışıq/söhbət; 3. *dial.* əsmə, həyəcan; in a ~ əsə-əsə, əsərək

**twitter**[2] ['twɪtəʳ] *v* 1. civildəmək, cikkildəmək *(quş)*; 2. çərənləmək, naqqallıq/boşboğazlıq etmək, laqqırtı vurmaq; 3. *dial.* əsmək, titrəmək; to ~ with cold/with excitement soyuqdan/həyəcandan əsmək/ titrəmək

**two** [tu:] *num.* 1. iki; *Two and two make four İki üstəgəl iki dörd eylər*; 2. iki *(rəqəm)*, ikilik; 3. ikinci; chapter ~ ikinci fəsil; Room ~ ikinci otaq; 4. ikilik *(kartda)*: ~ of hearts ikilik ürək /qırmızı toxmaq; 5. *pl* cüt, qoşa, cüt-cüt, qoşa-qoşa; to walk in ~s qoşa/qoşa-qoşa gəzmək; 6. iki il *(yaş haq.)*; *He is two O, iki yaşındadır*; at ~ iki yaşında; a boy/a girl of ~ iki yaşında oğlan/qız;

◊ in ~ 1) ikiyə, iki yerə/hissəyə; to cut in ~ ikiyə/ iki yerə bölmək; 2) ayrılıqda, ayrı-ayrı, ayrıca; to put ~ and ~ together 1) vəziyyəti qiymətləndirmək, işin nə yerdə olduğunu başa düşmək/dərk etmək; 2) anlamaq, sezmək, duymaq; *Two in distress makes sorrow less at. söz.* ≅ *Dərd bölüşdükcə yüngülləşər*

**two-edged** ['tu:'edʒd] *adj* 1. ikiağızlı; a ~ dagger ikiağızlı xəncər; 2. ikimənalı; a ~ hint ikimənalı eyham

**two-engined** ['tu:endʒɪnd] *adj* ikimotorlu, ikimühərrikli

**two-eyed** ['tu:aɪd] *adj* ikigözlü

**two-faced** ['tu:'feɪst] *adj* ikiüzlü, yalançı, qeyri-səmimi; a ~ man ikiüzlü adam

**two-field** ['tu:fi:ld] *adj k.t.* ikitarlalı

**twofold**[1] ['tu:fould] *adj* 1. ikiqat, iki dəfə artıq; 2. iki variantda mövcud olan; 3. ikiqat artırılmış; 4. ikiüzlü, riyakar, saxta; 5. tərəddüd edən, qətiyyətsiz

**twofold**[2] ['tu:fould] *adv* iki dəfə artıq/çox

**two-footed** ['tu:futɪd] *adj* ikiayaqlı

**two-handed** ['tu:hændɪd] *adj* 1. ikidəstəkli, ikiqulplu; a ~ saw ikidəstəkli mişar/bıçqı; 2. iki əl üçün olan; 3. iki əldən istifadə edən *(yəni həm sağ, həm də sol əli ilə işləyə bilən)*; zirək, çevik

**two-headed** ['tu:'hedɪd] *adj* ikibaşlı; a ~ eagle ikibaşlı qartal *(gerb və s.-də)*

**two-man** ['tu:mən] *adj* 1. ikiadamlıq, iki adamdan ibarət olan; a ~ committee iki adamdan ibarət olan komissiya; a ~ comedy ikiadamlıq (iki aktyorun oynadığı) komediya/məzhəkə; a ~ exhibition iki rəssamın əsərlərindən ibarət sərgi; 2. ikiyerli *(təyyarə, maşın və s.)*



**two-master** ['tu:,ma:stəʳ] *n* ikidorlu gəmi

**two-monthly** ['tu:'mʌnθlɪ] *adj* ikiaylıq, iki ayda bir dəfə baş verən

**twoness** ['tu:nɪs] *n* ikilik, qoşalıq

**two-oar** ['tu:'ɔ:] *n* ikiavarlı qayıq

**two-part** ['tu:'pa:t] *adj* ikihissəli; a ~ film ikihissəli film

**twopence** ['tʌpəns] *n* iki pens;

◊ not to care a ~ laqeyd olmaq/yanaşmaq, laqeydlik göstərmək

**twopenny** ['tʌpnɪ] *adj* 1. ikipenslik; a ~ bun ikipenslik bulka; ~ tube *arx.* London metrosu; 2. ucuz, yararsız, dəyərsiz

**two-ply** ['tu:plaɪ] *adj* ikiqat, ikiqatlı

**two-seater** [,tu:'si:təʳ] *n* ikiyerli avtomobil/təyyarə və s.

**two-time** ['tu:taɪm] *v* aldatmaq, vəfasızlıq etmək, vəfasız çıxmaq *(ər, arvad haq.)*

**two-tongued** [,tu:'tʌŋd] *adj* ikidilli, riyakar, yalançı

**two-way** [,tu:'weɪ] *adj* 1. ikitərəfli; ~ deal ikitərəfli razılaşma/saziş/sövdə; ~ communication *hərb.* ikitərəfli əlaqə; ~ traffic ikitərəfli küçə hərəkəti; 2. ikixətli; ~ railroad ikixətli dəmiryolu

**tympanist** ['tɪmpənɪst] *n mus.* təbilçi, təbilçalan

**tympanum** ['tɪmpənəm] *n (pl həm də* -na) baraban, təbil, dəf, qaval

**typal** ['taɪpəl] *adj* tipik, səciyyəvi; ~ image tipik surət/imic

**type**[1] [taɪp] *n* 1. tip, tipik nümunə; literary ~ ədəbi tip; modern ~ of a man müasir adamın tipik nümunəsi; people of this ~ bu növ adamlar; *I dislike men of that type Mən o tip adamları xoşlamıram*; 2. qrup, növ, cür, sinif; blood ~ qan qrupu; that ~ of things bu növ/cür şeylər; seedless ~ of orange tumsuz portağal növü; 3. simvol, rəmz, əlamət; 4. nümunə, model *(incəsənətdə)*; a ~ of Italian beauty italyan gözəllik nümunəsi; 5. *poliqr.* şrift *(mətbəə hürufatı)*; black/bold/fat ~ qara/qalın/yağlı şrift; Italic ~ kursiv *(əlyazısına oxşayan mətbəə şrifti)*; Roman ~ düz latın şrifti

**type**[2] [taɪp] *v* 1. maşınkada/makinada yazmaq; to ~ a letter maşınkada/makinada məktub yazmaq; *She types well O, maşınkada/makinada yaxşı yazır*; 2. *tib.* qan qrupunu müəyyənləşdirmək/müəyyən etmək

**typesetter** ['taɪp,setəʳ] *n poliqr.* 1. mürəttib, mətbəədə hərfdüzən işçi; 2. nabor maşını, hərfdüzən maşın

**typesetting** ['taɪp,setɪŋ] *adj:* a ~ machine nabor maşını, hərfdüzən maşın

**typewrite** ['taɪpraɪt] *v* maşınkada/makinada yazmaq

**typewriter** ['taɪp,raɪtəʳ] *n* 1. maşınka, makina, yazı maşını/makinası; 2. makinaçı, maşinistka *(makinada yazan qadın)*

**typewriting** ['taɪp,raɪtɪŋ] *n* 1. makinada/maşınkada yazma; 2. makinada/yazı maşınkasında üzünü köçürmə

**typewritten** ['taɪp,rɪtn] *adj* makinada/ maşınkada yazılmış

**typhoid**[1] ['taɪfɔɪd] *n tib.* tif, qarın yatalağı

**typhoid**[2] ['taɪfɔɪd] *adj tib.* tifli, yatalaqlı, qarın yatalağına /tifə tutulmuş

**typhoon** [taɪ'fu:n] *n* qasırğa, tufan, şiddətli fırtına *(Sakit Okeanın qərbində baş verən)*

**typhous** ['taɪfəs] *adj* yatalaqlı, səpmə yatalaqlı, səpmə yatalağa tutulmuş

**typhus**[1] ['taɪfəs] *n tib.* səpmə yatalaq

**typical**[1] ['tɪpɪkl] *adj* 1. tipik, səciyyəvi; a ~ fact/ case/plant tipik fakt/hadisə/bitki; 2. simvolik

**typically**[1] ['tɪpɪkəlɪ] *adv* tipik/səciyyəvi olaraq; adəti üzrə; *Typically, she has forgotten her key again Adəti üzrə, o, açarını yenə də unudub*

**typify** ['tɪpɪfaɪ] *v (pt, pp* -fied) 1. tipik nümayəndəsi olmaq; 2. tipik nümunə olmaq; 3. təmsil etmək, bir şeyin simvolu olmaq; göstərmək; *In this picture the bomb typifies war and the dove typifies peace Bu şəkildə bomba müharibənin, göyərçin isə sülhün simvoludur*

**typing** ['taɪpɪŋ] *n* yazı maşınkasında/makinasında yazma

**typist** ['taɪpɪst] *n* makinaçı, maşinistka *(makinada yazan qadın)*

**typograph** ['taɪpəgra:f] *n* 1. çapçı; 2. korlar üçün yazı makinası/maşınkası

**typographer** [taɪ'pɒgrəfəʳ] *n* çapçı

**typographical** [,taɪpə'græfɪkl] *adj* mətbəə; mətbəəçilik, çapçılıq

**typographically** [,taɪpə'græfɪkəlɪ] *adv* mətbəə üsulu ilə

**typographist** [,taɪpə'græfɪst] *n* 1. mətbəə işini öyrənən adam; 2. mətbəə/çapçılıq işini bilən

**typography** [taɪ'pɒgrəfɪ] *n* 1. çapçılıq, çap işi, mətbəəçilik; kitab çap etmə; 2. tərtibat *(kitab haq.)*; a high standard of ~ yüksək standartlı kitab tərtibatı; *The typography was admirable Kitab çox gözəl tərtib edilmişdir, Kitabın tərtibatı çox gözəl/ cəzbedici idi*

**tyrannical** [tɪ'rænɪkl] *adj* müstəbid, zalım, zülmkar, qaniçən; ~ dynasty müstəbid/zalım /zülmkar sülalə; a ~ ruler müstəbid/zalım/qaniçən hökmdar

**tyrannically** [tɪ'rænɪkəlɪ] *adv* zalımlıqla, qəddarcasına, müstəbidliklə, tiran/müstəbid kimi

**tyrannize, -ise** ['tɪrənaɪz] *v* (over) zalımlıq/ qəddarlıq/müstəbidlik etmək, incitmək, zülm/ əziyyət vermək; to ~ over the weak zəiflərə zülm etmək/əziyyət vermək; *He tyrannizes his family O, ailəsinə zülm edir/əziyyət verir*

**tyrannous** ['tɪrənəs] *adj* = tyrannical

**tyranny** [ˈtɪrənɪ] *n* **1.** tiraniya, tiran hökuməti; **2.** istibdad, zülm, qəddarlıq; **3.** istibdad üsul idarəsi
**tyrant** [ˈtaɪrənt] *n* tiran, müstəbid; qəddar/zalım/zülmkar/qaniçən hökmdar; *Her boss is a complete tyrant Onun bosu/ sahibkarı çox müstəbiddir*
**tyre**[1] [taɪəʳ] *n* təkər, şin *(avtomobildə və s.)*; **a bicycle** ~ velosiped təkəri; **a spare** ~ ehtiyat təkər; **to check the pressure of the** ~ təkərin təzyiqini ölçmək; **pneumatic** ~ pnevmatik təkər; **a flat** ~ havası boşalmış təkər; *His tyres are badly worn Onun təkərləri çox pis yeyilib/sürtülüb*
**tyre**[2] [taɪəʳ] *adj* təkər, şin; ~ **inflator** şin/təkər nasosu
**tyre**[3] [taɪəʳ] *v* şin taxmaq *(təkərə)*



# Uu

**U u** [ju:] *n (pl* **U's, u's** [ju:z]) *ingilis əlifbasının 21-ci hərfi*
**ubiquitious** [ju:ˈbɪkwɪtəs] *adj* **1.** hər yerdə mövcud olan/hazır; **the ~ British tourists** hər yerdə mövcud olan Britaniya turistləri; **2.** *məc.* harada aş, orada baş; **3.** hər yerdə olan/tapılan; **bricks made from a ~ grey mud** hər yerdə tapılan boz palçıqdan istehsal olunmuş kərpiclər
**ubiquity** [ju:ˈbɪkwətɪ] *n* hər yerdə mövcud olma/tapılma
**U-boat** [ˈju:bout] *n* alman sualtı qayığı
**U-bolt** [ˈju:boult] *adj tex.* U formalı/şəkilli
**U-bomb** [ˈju:bɔm] *n hərb.* uran bombası
**udder** [ˈʌdəʳ] *n* yelin, əmcək *(heyvanlarda)*
**uglify** [ˈʌglɪfaɪ] *v (pt, pp* **-fied** [-faɪd]) **1.** eybəcər etmək/hala salmaq; çirkinləşdirmək; *They uglified the edifice with a gallery Şüşəbənd tikməklə onlar binanı eybəcər hala saldılar;* **2.** *məc.* şikəst/təhrif /xarab etmək, korlamaq
**ugliness** [ˈʌglɪnɪs] *n* **1.** eybəcərlik, kifirlik, çirkinlik, biçimsizlik; *I haven't seen such ugliness in any other town Mən başqa heç bir şəhərdə belə eybəcərlik görməmişəm;* **2.** alçaqlıq, iyrənclik, əclaflıq; pis/ iyrənc/murdar şey, mənfurluq
**ugly** [ˈʌglɪ] *adj* **(-ier, -iest) 1.** eybəcər, çirkin, kifir; **an ~ face** eybəcər/çirkin sifət; **an ~ child** çirkin/kifir uşaq; **an ~ building** eybəcər bina; **~ clothes** eybəcər paltar; **to grow ~** eybəcərləşmək, kifirləşmək, çirkinləşmək; **2.** xoşagəlməz, pis, yaman, iyrənc, nalayiq; **~ news** xoşagəlməz/pis xəbər; **~ habits** pis/nalayiq adətlər; **3.** təhlükəli, qorxulu; **an ~ symptom** təhlükəli/qorxulu əlamət; **~ cloud** təhlükəli bulud; **~ threats** təhlükəli /qorxulu hədələr; **~ rumours** təhlükəli/qorxulu şayiələr
**Uigur** [wi:gəʳ] *n* **1.** uyqur *(xalq)*; **the ~s** *top.i* uyqurlar; **2.** uyqur dili
**Uigur** [wi:gəʳ] *adj* uyqur; **the ~ language** uyqur dili
**Ukrainian**[1] [ju:kˈreɪnɪən] *n* **1.** ukraynalı; **the ~s** *top. i* ukraynalılar; **2.** Ukrayna dili
**Ukrainian**[2] [ju:kˈreɪnɪən] *adj* Ukrayna; **the ~ language** Ukrayna dili; **~ towns** Ukrayna şəhərləri
**ulcer** [ˈʌlsəʳ] *n* **1.** *tib.* yara, xora; **a gastric ~** qastrit xorası; *I've got an ulcer on the inside of my mouth Mənim ağzımın iç tərəfində yara var;* **2.** şər mənbəyi/yuvası; mənəvi pozğunluq
**ulcerate** [ˈʌlsəreɪt] *v* **1.** *tib.* yara/xora törətmək; yara basmaq; *Some drugs can ulcerate the stomach lining Bəzi dərmanlar mədənin divarlarında xora törədə bilər;* **2.** xarab /məhv/tələf etmək; mənəviyyatca korlamaq/pozmaq
**ulceration** [ˈʌlsəreɪʃn] *n tib.* yara/xora basma, yara tökmə
**ulcerous** [ˈʌlsərəs] *adj* yaralı, yara/xora basmış; **~ skin** yara basmış dəri
**ulna** [ˈʌlnə] *n anat.* *(pl* **-nae**) dirsək sümüyü
**ulnae** [ˈʌlni:] **ulna** *isminin cəm forması*
**ulnar** [ˈʌlnəʳ] *n anat.* dirsək əsəbi
**ulterior** [ʌlˈtɪərɪəʳ] *adj* **1.** gizli, gizlin; görünməyən, aydın olmayan; **~ motives** gizli/görünməyən səbəblər; **~ plans** gizli/gizlin planlar; **~ objects** gizlin məqsədlər; **2.** sonrakı, gələcək; **3.** o biri tərəfdə olan/yerləşən; **on the ~ side of the river** çayın o biri tərəfində
**ultimate**[1] [ˈʌltɪmət] *n* **1.** son nəticə; hədd, hüdud; **the ~ of his desire** onun arzularının həddi/hüdudu; **2.** əsas/başlıca prinsip
**ultimate**[2] [ˈʌltɪmət] *adj* **1.** son, qəti; **~ result** son nəticə; **our ~ aim/goal** bizim son məqsədimiz; **an ~ decision** qəti/son qərar; **~ reply/answer** qəti/son cavab; **2.** əsas, elementar; **~ truths** elementar həqiqətlər; **~ analysis** *kim.* elementar analiz; **3.** ən uzaq; **the ~ ends of the earth** dünyanın/yer kürəsinin ən uzaq hissələri
**ultimate**[3] [ˈʌltɪmeɪt] *v* **1.** tamamlamaq, bitirmək, qurtarmaq, başa çatdırmaq; **2.** tamamlanmaq, qurtarmaq, başa çatmaq, sonuclanmaq, nəticəsi olmaq
**ultimately** [ˈʌltɪmətlɪ] *adv* sonda, nəhayətdə, axırda, nəticədə; *Ultimately they became friends again Sonda/Axırda onlar yenidən dost oldular; Ultimately you'll have to make the decision yourself Axırda/Sonda qərarı sən özün qəbul etməli olacaqsan*
**ultimatum** [ˌʌltɪˈmeɪtəm] *n* **1.** *(pl* **ultimatums**) ultimatum *(son və qəti xəbərdarlıq)*; **to deliver an ~ to a country, to present a country with an ~** bir ölkəyə ultimatum vermək/göndərmək; **2.** son məqsəd; *To be married was still the ultimatum of her wishes Ərə getmək hələ də onun əsas arzusu idi*
**ultra-** [ˈʌltrə-] *pref əsasən sifətdüzəldən şəkilçi: Azərbaycan türkcəsində* **ultra-** *komponentinə uyğun gəlir;* **ultra-**modern **ultra**müasir; **ultra-**short **ultra**qısa; **ultra-**violet **ultra**bənövşəyi
**ultra-fashionable** [ˈʌltrəˈfæʃnəbl] *adj* ultradəbli
**ultra-rich** [ˈʌltrəˈrɪtʃ] *adj* həddən artıq dövlətli
**ultra-short** [ˈʌltrəˈʃɔ:t] *adj* ultraqısa
**ultra-violet** [ˈʌltrəˈvaɪəlɪt] *adj* ultrabənövşəyi
**umber** [ˈʌmbəʳ] *n* umbra *(qəhvəyi rəngli mineral boya)*
**umbra**[1] [ˈʌmbrə] *adj* tünd-qəhvəyi
**umbra**[2] [ˈʌmbrə] *v* umbra ilə rəngləmək/boyamaq

**umbilical** [ˌʌmbɪ'laɪkəl] *adj* 1. *anat.* göbək; ~ **cord** göbəkbağı; ~ **hernia** göbək qrijası/yırtığı; 2. mərkəzi vəziyyətdə olan; **the ~ polar of a vault** tağ-tavanın orta sütunu
**umblicate** [ʌm'blɪkɪt] *adj anat.* göbəyəoxşar, göbəyəbənzər; ortasında çuxuru/oyuğu olan
**umbilici** [ʌm'bɪlɪsaɪ] *n* **umbilicus** *isminin cəm forması*
**umbilicus** [ʌm'bɪlɪkəs] *n (pl* **-ici***) anat.* 1. göbək; 2. dayaz çuxur/oyuq; 3. dayaz kərtik/çərtik/kəsik yeri/ çapıq
**umbrage**[1] ['ʌmbrɪdʒ] *n* 1. inciklik, incimə, küsü; **to give ~ to** *smb.* bir kəsi küsdürmək; **to take ~ at** *smb.* bir kəsdən incimək/küsmək; 2. *şair.* kölgə, örtük
**umbrage**[2] ['ʌmbrɪdʒ] *v* 1. kölgə salmaq, kölgə ilə örtmək; 2. küsdürmək, incitmək, könlünü sındırmaq, xətirə dəymək
**umbrageous** [ʌm'breɪdʒəs] *adj* 1. kölgəli; ~ **trees** kölgəli ağaclar; 2. küsəyən, tez küsən / inciyən /sınan, dəymədüşər
**umbrella** [ʌm'brelə] *n* 1. çətir, zontik; **to put up** *one's* ~ çətirini/zontikini açmaq; **to take down** *one's* ~, **to fold (up)** *one's* ~ çətirini/zontikini yığmaq/ qatlamaq; 2. *məc.* pərdə, örtük, örtü; sığınacaq, daldalanacaq; 3. *d.d.* açıq paraşüt
**umlaut** ['umlaut] *n dilç.* umlaut *(alman dilində sait səsin üstünə qoyulan və sait səsin dəyişməsini bildirən iki nöqtə)*
**umpire**[1] ['ʌmpaɪəʳ] *n* 1. vasitəçi; münsiflər hakimi; 2. *id.* hakim, referi, münsif; **to be an ~ at a match** yarışda hakim olmaq
**umpire**[2] ['ʌmpaɪəʳ] *v* 1. münsiflər hakimi olmaq; **to ~ between two parties** iki tərəf arasında münsiflər hakimi olmaq; 2. *id.* hakimlik etmək
**umpteen** ['ʌmpti:n] *adj d.d.* çox, çoxlu, saysız-hesabsız, qədərsiz; **to have ~ reasons for doing** *smth.* bir şeyi etməyə çoxlu/saysız-hesabsız səbəbi olmaq
**umpteenth** [ˌʌmp'ti:nθ] *adj d.d.* dəfələrlə, min dəfə; *That's the umpteenth time I've told you not to do that! Dəfələrlə mən sənə/sizə demişəm ki, onu etmə/etməyin!*
**un-** [ʌn-] *pref. Sifətə, zərfə bəzən isə ismə birləşərək inkarlıq bildirir:* **un**able **bacarıqsız**; **un**happy **bədbəxt**; **un**fortunately **bədbəxtlikdən**; **un**truth yalan, uydurma
**unabashed** [ˌʌnə'bæʃt] *adj* 1. vicdansız; utanmaz, abırsız, həyasız, arsız; 2. qorxmaz; möhkəm, sarsılmaz; **to stick ~ to** *one's* **opinion** öz fikrindən möhkəm yapışmaq/dönməmək
**unabated** ['ʌnə'beɪtɪd] *adj* azaldılmamış, zəiflədilməmiş; **with ~ speed** azaldılmamış sürətlə; *For three days the storm continued unabated Üç gün tufan zəifləmədən davam etdi*
**unabbreviated** ['ʌnə'bri:vɪeɪtɪd] *adj* qısaldılmamış, tam, bütöv
**unable** [ʌn'eɪbl] *adj* qabiliyyətsiz, bacarıqsız; iqtidarsız, aciz; **to be ~** qabiliyyətsiz/bacarıqsız/aciz olmaq, bacarmamaq; *She is unable to walk O yeriyə bilmir; I'd like to help you, but I'm unable to Mən sənə/sizə kömək etmək istərdim, lakin bacarmıram; I'm unable to comment this question Mən bu məsələni izah etməkdə acizəm, Mənim bu məsələni izah etməyə iqtidarım çatmır*
**unabolished** [ˌʌnə'bɔlɪʃt] *adj* ləğv olunmamış/edilməmiş, qüvvədə qalan
**unabridged** [ˌʌnə'brɪdʒd] *adj* tam, qısaldılmamış *(ədəbi əsər və s. haq.)*; **an ~ edition** tam/ qısaldılmamış nəşr
**unabrogated** [ʌn'æbrougeɪtɪd] *adj* ləğv edilməmiş *(qanun və s. haq.)*
**unacceptable** [ˌʌnək'septəbl] *adj* qəbuledilməz, qəbul edilə bilməyən; yolverilməz; ~ **terms** qəbuledilməz şərtlər; ~ **arguments** qəbuledilməz sübutlar/dəlillər; *Torture is totally unacceptable in a civilized society İşgəncə sivil cəmiyyətdə əsla yolverilməzdir*
**unaccepted** ['ʌnək'septɪd] *adj* qəbul edilməmiş/olunmamış, buraxılmamış *(bir yerə)*
**unacclimatized, -ised** ['ʌnək'lɪmətaɪzd] *adj* iqlimləşdirilməmiş, yeni iqlimə/mühitə uyğunlaşdırılmamış/uyğunlaşmamış
**unaccompanied** [ˌʌnə'kʌmpənɪd] *adj* 1. **(by, with)** müşayiət edilməyən *(bir kəs tərəfindən)*; *Children unaccompanied by an adult will not be admitted Böyüklərin müşayiət etmədiyi uşaqlar qəbul edilməyəcək/buraxılmayacaq*; 2. sahibsiz, sahibi olmayan; ~ **luggage/baggage** sahibsiz yük/baqaj; 3. *mus.* müşayiətsiz, müşayiət edilmədən; **to sing ~** müşayiətsiz oxumaq
**unaccountable** [ˌʌnə'kauntəbl] *adj* 1. başa düşülməyən, anlaşılmayan, dərkedilməz, qəribə; **an ~ person** anlaşılmaz/qəribə adam; ~ **reasons** anlaşılmayan/başa düşülməyən səbəblər; 2. məsuliyyətsiz, məsuliyyəti olmayan
**unaccountably** [ˌʌnə'kauntəblɪ] *adv* başa düşülməyən /müəmmalı/anlaşılmaz tərzdə; *He was unaccountably absent from the meeting Onun iclasda olmaması anlaşılmaz/müəmmalı idi*
**unaccounted** [ˌʌnə'kauntɪd] *adj* = **unaccounted-for**
**unaccounted-for** [ˌʌnəˌkauntɪd'fɔ:] *adj* 1. aydın/aşkar olmayan, örtülü, qeyri-müəyyən; anlaşılmaz; izah edilməmiş; 2. itkin düşmüş; *10 persons were dead and 15 unaccounted-for 10 adam öldü, 15 adam itkin düşdü*; 3. hesabatda xatırladılmamış/ göstərilməmiş, hesabata daxil edilməmiş; *These ten pounds are unaccounted-for in the balance-sheet Balansda bu on funt göstərilməyib, Bu on funt balansa daxil edilməyib*
**unaccredited** [ˌʌnə'kredɪtɪd] *adj* 1. vəkil edilməmiş; ixtiyar/vəkalət verilməmiş; 2. qeyri-rəsmi; **information from an ~ source** qeyri-rəsmi mənbədən alınmış məlumat
**unaccused** [ˌʌnə'kju:zd] *adj* ittiham edilməmiş
**unaccustomed** [ˌʌnə'kʌstəmd] *adj* 1. öyrənməmiş, adət etməmiş; ~ **to hot/cold climates** isti/soyuq iqlimə öyrənməmiş/adət etməmiş; *I am unaccustomed to such hard work Mən belə ağır işə öyrəşməmişəm*; 2. qeyri-adi, adət edilməmiş, alışılmamış, öyrənilməmiş; **the strange room and its ~ objects** qəribə otaq və onun qeyri-adi şeyləri; **her ~ silence** onun qeyri-adi sükutu



**unacknowledged** [ˌʌnək'nɔlɪdʒd] *adj* 1. tanınmamış, hamı tərəfindən qəbul edilməmiş; **an ~ member of the family** ailənin hamı tərəfindən qəbul edilməmiş üzvü; 2. cavabsız qalan; ~ **greeting** cavabsız qalan təbrik/salam; ~ **feelings** cavabsız qalan hisslər
**unacquainted** [ˌʌnə'kweɪntɪd] *adj* 1. tanış olmayan *(bir kəslə/şeylə)*; *I am unaquainted with him Mən onunla tanış deyiləm*; 2. bilməyən *(bir şeyi)*; *He is unacquainted with French O, fransız dilini bilmir*
**unaddressed** [ˌʌnə'drest] *adj* ünvansız *(məktub və s.)*; **an ~ envelope** ünvansız zərf
**unadmitted** [ˌʌnəd'mɪtɪd] *adj* tanınmamış, qəbul edilməmiş
**unadopted** [ˌʌnə'dɔptɪd] *adj* 1. görülməmiş; ~ **measures** görülməmiş tədbirlər; 2. oğulluğa götürülməmiş
**unadorned** [ˌʌnə'dɔ:nd] *adj* təbii, bəzəksiz, bəzəksiz-düzəksiz, saya; ~ **walls** bəzəksiz/saya divarlar; *Her language is simple and unadorned Onun dili sadə və bəzək-düzəksizdir*
**unadulterated** [ˌʌnə'dʌltəreɪtɪd] *adj* 1. həqiqi, əsl, xalis, saf; təbii, saxtalaşdırılmamış; 2. təmiz, tamam; ~ **nonsense** təmiz/tamam cəfəngiyyat
**unadventurous** [ˌʌnəd'ventʃərəs] *adj* macərasız; **an ~ life** macərasız həyat; **to lead an ~ life** macərasız həyat sürmək/yaşamaq; **an ~ journey** macərasız səyahət
**unadvertized, -ised** [ˌʌn'ædvətaɪzd] *adj* elan edilməmiş, reklam edilməmiş
**unaffected** [ˌʌnə'fektɪd] *adj* 1. sadə, təbii, sərbəst; ~ **manners** sərbəst/təbii xasiyyətlər; ~ **style** sadə/təbii üslub; 2. səmimi, həqiqi; ~ **joy** həqiqi sevinc; ~ **grief** həqiqi kədər; ~ **modesty** həqiqi/səmimi təvazökarlıq; 3. təsirə məruz qalmayan; ~ **by air or water** havanın və ya suyun təsirinə məruz qalmayan
**unafraid** [ˌʌnə'freɪd] *adj* qorxmaz, qorxmayan, çəkinməyən; **a businessman ~ of taking risk** risk etməkdən qorxmayan biznesmen
**unaided** [ʌn'eɪdɪd] *adj* 1. köməksiz; *He can now walk unaided O indi köməksiz yeriyə/gəzə bilir*; 2. adi; **to see** *smth.* **with the ~ eye** bir şeyi adi gözlə görmək
**unaimed** [ˌʌn'eɪmd] *adj* 1. məqsədsiz; 2. *hərb.* nişansız; ~ **fire** nişansız atəş
**unaired** [ˌʌn'eəd] *adj* 1. havası dəyişdirilməmiş; ~ **room** havası dəyişdirilməmiş otaq; 2. yaş, qurudulmamış; ~ **sheet** yaş döşəkağı/mələfə
**unalarmed** [ʌnə'la:md] *adj* sakit, dinc; arxayın, xatircəm; **to be ~ about** *smth.* bir şey haqqında arxayın /xatircəm olmaq
**unalienable** [ˌʌn'eɪljənbl] *adj* ayrılmaz; alınmaz, alına bilməz; ~ **right to liberty** alına bilməz azadlıq hüququ
**unalive** [ʌnə'laɪv] *adj* 1. ölü; cansız; ölüvay, süst; 2. hissiz, duyğusuz
**unalphabeted** [ˌʌnælfə'bɪtɪd] *adj* əlifbanı bilməyən/ tanımayan, savadsız
**unalterability** [ʌnˌɔ:ltərə'bɪlɪtɪ] *n* dəyişməzlik; pozulmazlıq, pozula/dəyişdirilə bilməmə; möhkəmlik, sarsılmazlıq, dayanıqlılıq
**unalterable** [ʌn'ɔ:ltərəbl] *adj* dəyişməyən, dəyişməz, daimi; möhkəm, sarsılmaz, dayanıqlı, davamlı; ~ **laws** dəyişməz/möhkəm/sarsılmaz qanunlar; ~ **dicisions** dəyişməz qərarlar
**unalterably** [ʌn'ɔ:ltərəblɪ] *adv* daim, həmişə, adətən, hər vaxt/dəfə; sabit, möhkəm
**unamazed** [ʌnə'meɪzd] *adj* təəccübləndirilməmiş, heyrətləndirilməmiş; valeh edilməmiş/olmamış, məftun olmamış; heyrətə salınmamış
**unambiguous** [ˌʌnæm'bɪgjuəs] *adj* tamamilə aşkar / aydın/müəyyən, qəti; **an ~ answer** tamamilə aydın / qəti cavab; ~ **terms** tamamilə aydın ifadə edilmiş / qəti şərtlər
**unambiguously** [ˌʌnæm'bɪgjuəslɪ] *adv* tamamilə aydın /aşkar/qəti olaraq
**unambition** [ˌʌnæm'bɪʃn] *n* iddiasızlıq, tələbkar /şöhrətpərəst olmama, aza qane olma
**unambitious** [ˌʌnæm'bɪʃəs] *adj* iddiasız, aza qane olan, qeyri-tələbkar, şöhrətpərəst olmayan
**unamenable** [ˌʌnə'mi:nəbl] *adj* inadlı, höcət, yolagetməz; sərt; sözə baxmayan/qulaq asmayan, itaətsiz; tərs, ipə-sapa yatmayan; ~ **to discipline** intizama /nizam-intizama tabe olmayan
**unamendable** [ˌʌnə'mendəbl] *adj* islaholunmaz, düzəldilməz, düzəldilə bilməyən, düzəldilməsi mümkün olmayan
**unamended** [ˌʌnə'mendɪd] *adj* düzəldilməmiş, dəyişiklik edilməmiş; **to pass a bill ~** qanun layihəsini düzəliş edilmədən qəbul etmək *(parlamentdə)*
**un-American** [ˌʌnə'merɪkən] *adj* Amerikanın əleyhinə / ziddinə; ~ **activity** Amerikanın əleyhinə / ziddinə fəaliyyət; ~ **Activities Committee** Amerika əleyhinə olan fəaliyyəti tədqiq edən komitə
**unamiability** [ʌnˌeɪmjə'bɪlɪtɪ] *n* soyuqluq, qaşqabaqlılıq, kəmiltifatlılıq, üzügülməzlik
**unamiable** [ˌʌn'eɪmjəbl] *adj* nəzakətsiz, qaba, kobud, sərt, soyuq, üzügülməz, qaşqabaqlı, soyuq
**unamiably** [ˌʌn'eɪmjəblɪ] *adv* soyuq, qaşqabaqla, soyuq/qaşqabaqlı tərzdə, pis sifətlə
**unamusing** [ˌʌnə'mju:zɪŋ] *adj* əyləndirici olmayan, maraqsız
**unanalogous** [ˌʌnə'næləgəs] *adj* oxşamayan, bənzəməyən, oxşarı/bənzəri/analoqu olmayan

**underground**[1] [ˌʌndəˈgraund] *n* 1. torpaqaltı qat, torpağın ana qatı; 2.: (**the** ~) metropoliten, metro; **to travel by** ~ metro ilə getmək
**underground**[2] [ˌʌndəˈgraund] *adj* 1. yeraltı; metro; ~ **passages** yeraltı keçidlər; ~ **caves** yeraltı mağaralar; ~ **railway** yeraltı dəmir yolu; ~ **stations** metro stansiyaları; 2. gizli, xəlvət; ~ **intrigues** gizli intriqalar
**underground**[3] [ˌʌndəˈgraund] *adv* 1. yer altından; **water flowing** ~ yer altından axan su; 2. gizlin, gizli olaraq, gizlicə, xəlvətcə, əlaltından; **to go** ~ gizli iş şəraitinə keçmək
**undergrowth** [ˈʌndəgrouθ] *n* kolluq, xırda ağaclıq *(meşədə)*, cavan meşə
**underhand**[1] [ˈʌndəhænd] *adj* 1. gizli, məxfi, xəlvəti; ~ **intrigues** gizli intriqalar/çəkişmələr; 2. qeyri-səmimi, ikiüzlü, səmimiyyətsiz, örtülü
**underhand**[2] [ˈʌndəhænd] *adv* gizlicə, xəlvətcə, gizli, əl altından, əlaltdan
**underlie** [ˌʌndəˈlaɪ] *v (pt* **underlay** [ˌʌndəˈleɪ]; *pp* **underlain** [-ˈleɪn]) *(Məchul növdə işlənmir).* əsasını təşkil etmək *(hərəkətin, nəzəriyyənin və s.)*; **the principles which** ~ **our policy** bizim siyasətimizin əsasını təşkil edən prinsiplər
**underline** [ˌʌndəˈlaɪn] *v* 1. altından cızıq/xətt çəkmək *(sözün, cümlənin və s.)*; 2. xüsusi olaraq nəzərə çarpdırmaq, vurğulamaq
**underlinen** [ˈʌndəˌlɪnɪn] *n* dəyişək, alt paltarı, tuman-köynək
**undermanned** [ˌʌndəˈmænd] *adj* 1. fəhlə qüvvəsinə ehtiyacı olan/ehtiyac hiss edən *(ştat haq.)*; ~ **industries** fəhlə qüvvəsinə ehtiyacı olan sənaye sahələri; 2. *hərb.* qeyri-kifayət qədər güclə tutulmuş
**undermaster** [ˌʌndəˈma:stə(r)] *n* məktəbdə müəllim köməkçisi
**undermine** [ˌʌndəˈmaɪn] *v* 1. altını qazmaq; **to** ~ **a wall** divarın altını qazmaq; 2. altdan yumaq, altdan yuyub aparmaq/oymaq, aşındırmaq; *The sea is undermining the cliffs of the south coast Dəniz cənub sahillərinin qayalarının altını yuyub aparır/aparmaqdadır*; 3. korlamaq, pozmaq, sarsıtmaq; qırmaq; **to** ~ ***smb.'s*** **authority** bir kəsin nüfuzunu korlamaq, bir kəsi hörmətdən/nüfuzdan salmaq; *Prolonged overwork had undermined his health Uzunmüddətli ağır iş onun səhhətini korlamışdı*
**underneath**[1] [ˌʌndəˈni:θ] *n* alt, alt tərəf; **the** ~ **of a car/of a shelf/of a sofa** maşının/şkafın/divanın altı
**underneath**[2] [ˌʌndəˈni:θ] *adj* 1. gizli; ~ **meaning** gizli məna; 2. aşağı, aşağıda olan
**underneath**[3] [ˌʌndəˈni:θ] *adv* aşağıda, altda, aşağıdakı mərtəbədən; *There's a pile of newspapers in the corner – have you looked underneath? Küncdə bir qalaq qəzet var – alta baxıbsanmı?/baxıbsınızmı?; A lot of noise was coming from the flat underneath Aşağıdakı mərtəbədə olan mənzildən çox səs gəlirdi*
**underneath**[4] [ˌʌndəˈni:θ] *prep* ...altında, ...altına, ...altından; **to sit** ~ **the tree** ağacın altında oturmaq; *Put the date underneath the address Tarixi ünvanın altında yaz/yazın; The coin rolled underneath the piano Sikkə/Dəmir pul pianonun altına girləndi*; **treachery** ~ **the mask of friendliness** dostluq pərdəsi/maskası altında satqınlıq
**undernourish** [ˌʌndəˈnʌrɪʃ] *v* lazımi/kifayət qədər/ doyunca yedirtməmək, doyunca/kifayət qədər yemləməmək *(heyvanı)*
**undernourished** [ˌʌndəˈnʌrɪʃt] *adj* lazımi/kifayət/ doyunca yedirilməmiş, lazımi/kifayət qədər yemlənməmiş
**undernourishment** [ˌʌndəˈnʌrɪʃmənt] *n* kifayət qədər olmayan qida, doyunca/kifayət qədər yeməmə
**underpants** [ˈʌndəˌpænts] *n pl* tuman-köynək, alt paltarı
**underpaid** [ˌʌndəˈpeɪd] *adj* az əmək haqqı verilən, kifayət qədər/lazımınca əmək haqqı verilməyən; ~ **workmen** az əmək haqqı verilən fəhlələr/işçilər
**underpaid** [ˌʌndəˈpeɪd] **to underpay** *felinin pt, pp formaları*
**underpart** [ˈʌndəpa:t] *n* 1. aşağı hissə; 2. *teatr.* ikinci dərəcəli rol/rol oynayan aktyor
**underpay** [ˌʌndəˈpeɪ] *v (pt, pp* **underpaid** [-peɪd]) az haqq vermək; *He underpaid me for the work İşə görə o mənə az haqq verdi*
**underprivileged** [ˌʌndəˈprɪvəlɪdʒd] *adj* 1. imtiyazsız, imtiyazı az olan, imtiyazı alınmış; 2. *amer.* kasıb, yoxsul; ~ **children** kasıb ailələrin uşaqları, baxımsız/nəzarətsiz uşaqlar
**underrate** [ˌʌndəˈreɪt] *v* qiymət verməmək, lazımi qədər qiymətləndirməmək; **to** ~ ***one's*** **opponent** rəqibini/düşmənini lazımi qədər qiymətləndirməmək
**underripe** [ˌʌndəˈraɪp] *adj* dəyməmiş, yetişməmiş; ~ **fruit** dəyməmiş meyvə
**underscore** [ˌʌndəˈskɔ:(r)] *v* 1. altından cızıq/xətt çəkmək, nəzərə çarpdırmaq; *Two words were underscored in red ink İki sözün altından qırmızı mürəkkəblə cızıq/xətt çəkilmişdi*; 2. nəzərə çarpdırmaq, vurğulamaq
**undersea** [ˈʌndəsi:] *adj* dənizaltı; ~ **exploration** dənizaltı kəşfiyyat
**under-secretary** [ˌʌndəˈsekrətrɪ] *n* 1. nazirin köməkçisi/müavini; 2. Birləşmiş Millətlər Təşkilatının baş katibinin müavini/köməkçisi
**undersell** [ˌʌndəˈsel] *v (pt, pp* **undersold** [-sould]) ucuz qiymətə satmaq, başqalarına nisbətən aşağı qiymətə satmaq
**undershirt** [ˈʌndəʃə:t] *n* alt köynəyi
**underside** [ˈʌndəsaɪd] *n* alt tərəf; *She saw a lable stuck to the underside of the table O, stolun alt tərəfinə yapışdırılmış etiketi gördü*
**undersigned** [ˌʌndəˈsaɪnd] *adj* aşağıda qol çəkən, imza edən; **we the** ~... biz, aşağıda imza edənlər...
**undersized** [ˌʌndəˈsaɪzd] *adj* azaldılmış, adi



ölçüdən balaca/kiçik, balaca; *The cubs were weak and undersized Balalar zəif və balaca idilər*
**undersold** [ˌʌndəˈsould] **to undersell** *felinin pt, pp formaları*
**understaffed** [ˌʌndəˈsta:ft] *adj* komplektləşdirilməmiş, tamamlanmamış *(ştat haq.)*
**understand** [ˌʌndəˈstænd] *v (pt, pp* **understood**) 1. başa düşmək; **to** ~ **a question** sualı/məsələni başa düşmək; *I don't understand what you say Mən sənin/sizin nə dediyini/dediyinizi başa düşmürəm*; **to** ~ **one another/each other** bir-birini başa düşmək; 2. anlamaq, dərk etmək; *I don't understand what is the problem Mən problemin nə olduğunu anlamıram*; 3. eşitmək, öyrənmək; *I understand that he is going to marry Mən eşitmişəm ki, o evlənməyə hazırlaşır*; 4. güman etmək, sezmək, duymaq; 5. nəzərdə tutmaq, fərz etmək; *What do you understand by that? Sən/Siz bunun-la nəyi nəzərdə tutursan/tutursunuz?*;
◊ **to give to** ~ başa salmaq, anlatmaq; *I was given to understand that it was not true Məni başa saldılar ki, o, doğru deyil*
**understandable** [ˌʌndəˈstændəbl] *adj* 1. başa düşülə bilən, anlaşılan, aydın, asan; *The instructions were not understandable Təlimatlar anlaşılan/aydın deyildi*; 2. haqlı, əsaslı, təbii; ~ **motives** haqlı səbəblər/dəlillər/sübutlar; ~ **objections** haqlı/əsaslı etirazlar
**understandably** [ˌʌndəˈstændəblɪ] *adv* anlaşılacaq/ başa düşüləcək tərzdə, haqlı olaraq
**understanding**[1] [ˌʌndəˈstændɪŋ] *n* 1. anlama, başa düşmə, baş çıxarma; *He hasn't much understanding of the question O, bu məsələni çox da anlamır, O, bu məsələni çox da başa düşmür; He has a good understanding of mathematics Onun riyaziyyatdan yaxşı başı çıxır*; 2. ağıl, dərrakə, idrak, düşüncə, mühakimə qabiliyyəti; **mysteries beyond human** ~ insan idrakı xaricində olan sirlər; **a man of** ~ ağıllı/dərrakəli/düşüncəli adam; *He has an excellent understanding O çox ağıllı/dərrakəli/düşüncəli adamdır*; 3. razılıq, qarşılıqlı anlaşma, bir-birini başa düşmə, fikir birliyi; ~ **between husband and wife** ər və arvad arasında razılıq/qarşılıqlı anlaşma; ~ **between the nations of the world** dünya xalqları arasında qarşılıqlı anlaşma/fikir birliyi; 4. razılaşma, saziş, sözləşmə, müqavilə; **to come to /to reach an** ~ saziş əldə etmək; **to have a secret** ~ gizli razılaşma əldə etmək; *They have a secret understanding with other firms Onların başqa firmalarla gizli razılaşmaları/müqavilələri var*; **on this** ~ bu şərtlə; *On the understanding that... Bu şərtlə ki,...*
**understanding**[2] [ˌʌndəˈstændɪŋ] *adj* 1. başa düşən, anlayan, ağıllı, dərrakəli; 2. həssas, qayğıkeş, canıyanan; ~ **heart** həssas ürək/qəlb; ~ **parents** qayğıkeş/canıyanan valideynlər
**understate** [ˌʌndəˈsteɪt] *v* 1. azaltmaq, kiçiltmək; əhəmiyyət verməmək, saymamaq; 2. öz rəyini/öz fikrini ehtiyatla demək/axıra qədər söyləməmək
**understatement** [ˈʌndəˈsteɪtmənt] *n* kiçiltmə, azaltma, lazımınca əhəmiyyət verməmə
**understood** [ˌʌndəˈstud] **to understand** *felinin pt, pp formaları*
**understudy**[1] [ˈʌndəstʌdɪ] *n teatr.* dublyor *(eyni rol oynayan aktyor)*
**understudy**[2] [ˈʌndəstʌdɪ] *v teatr. (pt, pp* **-died**) hər hansı bir rolda əsas ifaçını əvəz etmək
**undertake** [ˌʌndəˈteɪk] *v (pt* **undertook** [-ˈtuk]; *pp* **undertaken** [-ˈteɪkn]) 1. iqdam/təşəbbüs etmək; **to** ~ **a journey** səyahətə təşəbbüs etmək; 2. öz üzərinə/boynuna götürmək *(təəhhüd, öhdəlik və s.)*; **to** ~ **responsibility** öz üzərinə məsuliyyət götürmək; **to** ~ **a task** boynuna tapşırıq götürmək; 3. zamin olmaq, zəmanət vermək; *I will undertake that he will finish the work in time Mən zəmanət verirəm ki,/zamin oluram ki, o, işi vaxtında qurtaracaq*
**undertaken** [ˌʌndəˈteɪkn] **to undertake** *felinin pp forması*
**undertaker** [ˌʌndəˈteɪkə(r)] *n* 1. sahibkar, müəssisə sahibi; 2. dəfn mərasimini təşkil edən büronun sahibi
**undertaking** [ˌʌndəˈteɪkɪŋ] *n* 1. iş; **difficult/ dangerous** ~ çətin/təhlükəli iş; 2. öhdəlik, öhdəçilik; iltizam; **an** ~ **to pay the debt within six months** borcu altı ay müddətində vermək haqqında iltizam
**undertone** [ˈʌndətoun] *n* 1. alçaq səs/ton, yarım ton; *They talked in undertones Onlar alçaq səslə danışdılar*; 2. çalar; 3. gizli/daxili məna
**undertook** [ˌʌndəˈtuk] **to undertake** *felinin pt forması*
**undervalue** [ˌʌndəˈvælju:] *v* 1. qiymət verməmək, lazımi qədər qiymətləndirməmək, çox aşağı qiymətləndirmək; 2. qiymətdən salmaq
**underwater**[1] [ˌʌndəˈwɔ:tə(r)] *n* yeraltı su
**underwater**[2] [ˌʌndəˈwɔ:tə(r)] *adj* sualtı; ~ **sport** sualtı idman; ~ **caves** sualtı mağaralar; ~ **explorers** sualtı kəşfiyyatçılar, suyun altında kəşfiyyat aparan adamlar
**underwear** [ˈʌndəweə(r)] *n* alt paltarı/geyimi
**underweight** [ˌʌndəˈweɪt] *adj* çəkisi az olan *(adi qaydadan)*; **an** ~ **baby** çəkisi az olan uşaq; *You are only slightly underweight for your age Sənin/Sizin çəkin/çəkiniz yaşına/yaşınıza görə bir azca azdır*
**underwent** [ˌʌndəˈwent] **to undergo** *felinin pt forması*
**underworld** [ˈʌndəwə:ld] *n* 1. cəhənnəm; 2. cəmiyyətin tör-töküntüləri
**underwrite** [ˌʌndəˈraɪt] *v (pt* **underwrote** [-ˈrout]; *pp* **underwritten** [-ˈrɪtn]) 1. qol çəkmək, imza etmək, imzalamaq; 2. qol çəkilmək, imzalanmaq; 3. zəmanət vermək, zamin olmaq, himayə etmək
**underwriter** [ˌʌndəˈraɪtə(r)] *n* zəmanət verən *(adam)*, zamin olan *(adam)*

**undeserved** [ˌʌndɪ'zɜ:vd] *adj* layiq olmayan, haqsız; ~ **praise** layiq olmayan tərif; ~ **punishment** haqsız cəza

**undeserving** [ˌʌndɪ'zɜ:vɪŋ] *adj* layiq olmayan; nalayiq, ləyaqətsiz; ~ **of respect** hörmətə layiq olmayan

**undeservingly** [ˌʌndɪ'zɜ:vɪŋlɪ] *adv* haqsız/ədalətsiz olaraq; layiq/haqqı olmadan; layiq olmadığı halda

**undesirable**[1] [ˌʌndɪ'zaɪərəbl] *n* arzuolunmaz şəxs/adam

**undesirable**[2] [ˌʌndɪ'zaɪərəbl] *adj* **1.** istənilməyən, istənilməz, arzu edilməyən, arzuedilməz; xoşagəlməyən, yolverilməz; ~ **influence** arzuedilməz/ xoşagəlməz təsir; ~ **manners** arzuolunmaz/ arzuedilməz xasiyyətlər; **2.** münasib olmayan, yaramayan, əl verməyən, əlverişli/ münasib olmayan; **an** ~ **moment** əlverişli/münasib olmayan an

**undesired** [ˌʌndɪ'zaɪəd] *adj* çağırılmamış, istənilməyən, dəvət olunmamış; ~ **guests** çağırılmamış/dəvət olunmamış qonaqlar

**undestroyable** [ˌʌndɪs'trɔɪəbl] *adj* dağılmaz, sarsılmaz, yenilməz, möhkəm; ~ **union** sarsılmaz/ möhkəm ittifaq

**undestroyed** [ˌʌndɪs'trɔɪd] *adj* dağıdılmamış, uçulmamış, bütöv

**undetected** [ˌʌndɪ'tektɪd] *adj* öyrənilməmiş, kəşf edilməmiş, tapılmamış; *The disease went /remained undetected for several years Bu xəstəlik bir neçə il öyrənilməmiş qaldı*

**undetermined** [ˌʌndɪ'tɜ:mɪnd] *adj* **1.** qeyri-müəyyən, müəyyən/aydın olmayan; **2.** həll olunmamış/ edilməmiş; **an** ~ **question/problem** həll edilməmiş məsələ/problem; *One problem still remains undetermined Bir problem hələ də həll edilməmiş/olunmamış qalır*

**undeveloped** [ˌʌndɪ'veləpt] *adj* **1.** inkişaf etməmiş; geridə qalmış; ~ **child** inkişaf etməmiş/zəif inkişaf etmiş uşaq; ~ **nations** inkişaf etməmiş ölkələr; ~ **muscles/organs** zəif inkişaf etmiş əzələlər/orqanlar; **2.** *k.t.* xam; ~ **land** xam torpaq

**undid** [ʌn'dɪd] **to undo** *felinin pt forması*

**undies** ['ʌndɪz] *n* alt paltarı *(xüs. qadınlar üçün)*; *The woman appeared in her undies Qadın alt paltarında peyda oldu/göründü*

**undifferentiated** [ˌʌndɪfə'renʃɪeɪtɪd] *adj* fərqləndirilməmiş, ayrılmamış

**undigested** [ˌʌndaɪ'dʒestɪd] *adj* **1.** həzm olunmamış/ edilməmiş *(qida haq.)*; **2.** qavranılmamış; ~ **theories** qavranılmamış nəzəriyyələr

**undignified** [ʌn'dɪgnɪfaɪd] *adj* nalayiq, ləyaqətsiz, yaramaz *(davranış və s. haq.)*; **in an** ~ **manner** nalayiq/yaramaz bir tərzdə

**undiluted** [ˌʌndaɪ'lu:tɪd] *adj* qarışdırılmamış, suyuldulmamış, qatı; ~ **wine** qatışdırılmamış şərab/çaxır

**undiminished** [ˌʌndɪ'mɪnɪʃt] *adj* azalmamış, əskilməmiş; *My respect for him remains undiminished Mənim ona qarşı hörmətim azalmayıb*

**undirected** [ˌʌndaɪ'rektɪd] *adj* **1.** göstəriş verilməmiş, rəhbərsiz; **to find** *one's* **way** ~ yolunu göstərişsiz tapmaq; **2.** ünvansız, ünvanı yazılmamış; ~ **letters** ünvansız məktublar

**undischarged** [ˌʌndɪs'tʃa:dʒd] *adj* **1.** yerinə yetirilməmiş, icra olunmamış/edilməmiş; ~ **duty** yerinə yetirilməmiş vəzifə/borc; **2.** *tic.* ödənilməmiş; **3.** doldurulmamış *(silah haq.)*; ~ **gun** doldurulmamış silah; **4.** yükü boşaldılmamış *(gəmi)*

**undisciplined** [ˌʌndɪ'sɪplɪnd] *adj* intizamsız, nizamsız-intizamsız; sözə baxmayan/qulaq asmayan, itaət etməyən; ~ **pupils** intizamsız şagirdlər

**undisclosed** [ˌʌndɪs'klouzd] *adj* açılmamış, gizli, naməlum; **information from an** ~ **source** naməlum mənbədən alınmış məlumat; ~ **buyer/seller** adı çəkilməmiş alıcı/satıcı

**undiscovered** [ˌʌndɪs'kʌvəd] *adj* naməlum; ~ **murderer** naməlum cani; *The murderer still remains undiscovered Cani hələ də naməlum qalır/tapılmayıb*

**undiscussed** [ˌʌndɪs'kʌst] *adj* müzakirə edilməmiş; ~ **plans/questions** müzakirə edilməmiş planlar/ məsələlər; *The plan remains undiscussed Plan müzakirə edilməmiş qalır*

**undisguised** [ˌʌndɪs'gaɪzd] *adj* **1.** maskalanmamış, üzünə maska geyməmiş/taxmamış; başqa paltar geyməmiş; **2.** açıq, açıq-aşkar, aydın, açıqdan-açığa, aşkar; ~ **hatred** açıq-aşkar/açıqdan-açığa nifrət; ~ **joy** açıq/aşkar sevinc

**undisturbed** [ˌʌndɪ'stɜ:bd] *adj* **1.** həyəcanlandırılmamış, sakit, rahat, dinc; ~ **sleep** sakit/rahat yuxu; **2.** pozulmamış *(qayda haq.)*, qaydada olan; *We found everything undisturbed Biz hər şeyi qaydasında tapdıq*

**undivided** [ˌʌndɪ'vaɪdɪd] *adj* **1.** bölünməmiş, bütün; ~ **property** bölünməmiş mülkiyyət/əmlak; **2.** cəmlənmiş, mərkəzləşdirilmiş *(diqqət və s. haq.)*; **3.** ayrılmaz; ~ **friends** ayrılmaz dostlar

**undo** [ʌn'du:] *v (pt* **undid** [ʌn'dɪd]; *pp* **undone** [ʌn'dʌn]) **1.** açmaq; **to** ~ **a button/a collar/a parcel / a knot** düyməni/yaxalığı/bağlamanı/düyünü açmaq; **2.** qıfılı və s. açmaq; *He undid the bolt O, rəzəni açdı; He undid the door O, qapının qıfılını açdı*; **3.** məhv/ləğv etmək; **to** ~ **a treaty** müqaviləni ləğv etmək; *Drink has undone him İçki onu məhv etdi/onun axırına çıxdı*;

◊ *What is done cannot be undone Keçənə güzəşt deyərlər, Olanı geri qaytarmaq olmaz*

**undone** [ʌn'dʌn] *adj* **1.** açıq; *Your buttons are all undone Sənin/Sizin bütün düymələrin/düymələriniz açıqdır*; **2.** qurtarmamış; *Most of the work was left undone İşin əksər hissəsi görülməmiş qaldı*; **3.** məhv olan/edilən; **a great talent** ~ **by drink** içkinin məhv etdiyi böyük istedad



**undoubted** [ʌn'dautɪd] *adj* **1.** şübhəsiz, şəksiz; ~ **talent** şübhəsiz/şəksiz istedad; ~ **evidence** şübhəsiz /şəksiz sübut; **2.** əsl, həqiqi; ~ **masterpiece** əsl/ həqiqi şah əsəri

**undoubtedly** [ʌn'dautɪdlɪ] *adv* şübhəsiz, əlbəttə; *This painting is undoubtedly nice Bu şəkil şübhəsiz qəşəngdir*

**undress**[1] [ʌn'dres] *n* çılpaq, üryan; **to wander** ~ **round the bedroom** yataq otağında çılpaq gəzişmək /gəzmək

**undress**[2] [ʌn'dres] *v* **1.** soyunmaq, paltarını çıxartmaq; *Undress and get into bed Paltarını/Paltarınızı soyun/soyunun və çarpayıya gir /girin*; **2.** soyundurmaq; **to** ~ **a child** uşağı soyundurmaq

**undressed** [ʌn'drest] *adj* soyunmuş, çılpaq, lüt, üryan; *Are you undressed yet? Sən/Siz hələ də çılpaqsan?/çılpaqsınız?*

**undrinkable** [ʌn'drɪŋkəbl] *adj* içiləsi olmayan, içməyə yaramayan; *This wine is quite undrinkable Bu şərab qətiyyən içiləsi deyil*

**undue** [ˌʌn'dju:, -'du:] *adj* **1.** həddən artıq, lap/son dərəcə böyük/güclü; **2.** yaramayan, əlverməyən, əlverişli/münasib olmayan, yaraşmayan; ~ **behaviour** yaraşmayan davranış/əxlaq

**undulate** ['ʌndjuleɪt] *v* **1.** tərpənmək, dalğavarı yellənmək, dalğalanmaq; *The ripe corn undulates in the breeze Meh yetişmiş buğdanı dalğalandırır*; **2.** dalğavarı səthi olmaq *(bir şeyin)*

**undulated** ['ʌndjuleɪtɪd] *adj* dalğavarı, dalğayaoxşar, dalğayabənzər; dərə-təpə, kələ-kötür

**undulation** [ˌʌndju'leɪʃn] *n* **1.** dalğaya bənzəmə /bənzərlik/oxşama; **2.** dərə-təpəlik, kələ-kötürlük

**unduly** [ˌʌn'dju:lɪ, -'du:lɪ] *adv* **1.** həddən artıq, hədsiz, olduqca, son dərəcə; ~ **high prices** həddən artıq/son dərəcə optimist/yüksək qiymətlər; **to be** ~ **optimistic** son dərəcə optimist olmaq; **2.** qanunsuz/ ədalətsiz olaraq

**undurable** [ˌʌn'djuərəbl] *adj* **1.** davamsız, tezsınan, tezdağılan; **2.** uzunsürməyən, uzunmüddətli olmayan

**undyed** [ˌʌn'daɪd] *adj* boyanmamış; ~ **wool** boyanmamış yun

**undying** [ˌʌn'daɪɪŋ] *adj* **1.** ölməz, əbədi, həmyaşar; ~ **glory** ölməz/əbədi şöhrət; ~ **love** əbədi/ həmyaşar məhəbbət; **2.** həmişəlik, sönməz, daimi, arasıkəsilməz; ~ **interest** daimi maraq

**unearned** [ˌʌn'ɜ:nd] *adj* **1.** qazanılmamış; ~ **income** qazanılmamış gəlir; **2.** layiq olmayan; ~ **praise** layiq olmayan tərif

**unearth** [ʌn'ɜ:θ] *v* **1.** qazıb çıxartmaq *(torpağın altından)*; **to** ~ **buried treasure** basdırılmış xəzinəni qazıb çıxartmaq; **2.** yuvadan qovub çıxartmaq; **3.** aşkar etmək, üstünü açmaq; **to** ~ **a plot/a mystery** sui-qəsdin/sirrin üstünü açmaq

**unearthly** [ʌn'ɜ:θlɪ] *adj* **1.** fövqəladə, xariqüladə, valehedici, məftunedici; ~ **beauty** fövqəladə/ xariqüladə gözəllik; **2.** sirli, əsrarəngiz, anlaşılmaz, gizli, müəmmalı; ~ **scream** anlaşılmaz /müəmmalı qışqırtı; **3.** əlverişli /münasib olmayan, əlverməyən; namünasib; **an** ~ **hour** namünasib vaxt; *In my last job I had to get up at an unearthly hour Son işimdə mən namünasib vaxt qalxmalı olurdum (yuxudan)*

**uneasily** [ʌn'i:zɪlɪ] *adv* **1.** narahat, naqolay; **to sit** ~ narahat oturmaq; **to sleep** ~ narahat yatmaq; **2.** həyəcanla, təşvişlə, zəhmətlə

**uneasiness** [ʌn'i:zɪnɪs] *n* **1.** narahatlıq, naqolaylıq; **2.** sıxıntı, çətinlik, məhdudluq

**uneasy** [ʌn'i:zɪ] *adj* **1.** narahat, naqolay; **to feel** ~ **in tight clothes** dar paltarda özünü narahat hiss etmək; **2.** səksəkəli, həyəcanlı, qorxulu, iztirablı; ~ **dreams** qorxulu/səksəkəli yuxular; **an** ~ **conscience** iztirablı / həyəcanlı vicdan; *He passed an uneasy night O, həyəcanlı/iztirablı gecə keçirdi*; **3.** utancaq; ~ **smile** utancaq təbəssüm

**uneatable** [ʌn'i:təbl] *adj* yeyilməyən, yemək üçün yaramayan

**uneaten** [ʌn'i:tn] *adj* yeyilməmiş; ~ **food/meal** yeyilməmiş ərzaq/xörək

**uneconomic** [ˌʌnˌi:kə'nɔmɪk] *adj* **1.** sərfəsiz, sərfəli/faydalı olmayan; **2.** gəlirsiz, gəlir verməyən/gətirməyən; ~ **factories** gəlirsiz/gəlir verməyən fabriklər

**uneconomical** [ˌʌnˌi:kə'nɔmɪkl] *adj* **1.** sərfəsiz, sərfəli /faydalı olmayan; **2.** qənaətcil olmayan, israfçı, bədxərc

**uneducated** [ʌn'edʒukeɪtɪd] *adj* savadsız, təhsilsiz, oxumamış, cahil; ~ **speech/man** savadsız nitq/adam

**unemotional** [ˌʌnɪ'mouʃənl] *adj* emosional olmayan; tez təsirlənməyən; ehtirassız, şövqsüz, soyuq

**unemployable** [ˌʌnɪm'plɔɪəbl] *adj* işə qəbul oluna/ götürülə bilməyən, işə yaramayan

**unemployed** [ˌʌnɪm'plɔɪd] *adj* **1.** işsiz; işləməyən; **the** ~ *top. i* işsizlər; **2.** istifadə edilməmiş/ olunmamış; ~ **energies** istifadə olunmamış/ edilməmiş enerjilər; ~ **capital** istifadə edilməmiş kapital

**unemployment** [ˌʌnɪm'plɔɪmənt] *n* işsizlik; **to reduce** ~ işsizliyi azaltmaq; *He was thrown into unemployment when the factory closed Fabrik bağlananda o, işsiz qaldı*; **the rising of** ~ işsizliyin artması

**unending** [ˌʌn'endɪŋ] *adj* **1.** sonsuz, nəhayətsiz, hədsiz, intəhasız; ~ **chatter** sonsuz/nəhayətsiz boş danışıq/söhbət; ~ **complaints** sonsuz/nəhayətsiz şikayətlər; **2.** əbədi, ömürlük, daimi; **the** ~ **struggle to stay alive** yaşamaq üçün əbədi/daimi mübarizə; ~ **bliss** daimi xoşbəxtlik/səadət

**unendurable** [ˌʌnɪn'djuərəbl] *adj* dözülməz, qatlaşılmaz; ~ **pain** dözülməz ağrı

**unengaged** [ˌʌnɪn'geɪdʒd] *adj* **1.** öhdəlik/təəhhüd

götürməmiş; 2. nişanlanmamış, adaxlanmamış; 3. tutulmamış, boş

**unentangled** [ˌʌnɪn'tæŋgld] *adj* 1. dolaşıq salınmamış, dolaşdırılmamış; qarışdırılmamış; 2. *məc.* əl-qolu bağlanmamış; sərbəst, azad; ~ **with pacts** müqavilə ilə əl-qolu bağlanmamış

**unentertaining** [ʌnˌentə'teɪnɪŋ] *adj* maraqsız, əyləncəli olmayan, darıxdırıcı, usandırıcı, ürəksıxan; ~ **letters** maraqsız/darıxdırıcı/usandırıcı məktublar

**unenviable** [ʌn'envɪəbl] *adj* pis, bekar, arzuolunmaz; ~ **standard of living** arzuolunmaz yaşayış səviyyəsi; ~ **task** pis/arzuolunmaz tapşırıq

**unenvious** [ˌʌn'envɪəs] *adj* paxıl olmayan; **an ~ man** paxıl olmayan adam

**unequable** [ˌʌn'ekwəbl] *adj* möhkəm olmayan, dayanıqsız, mütərəddid

**unequal** [ʌn'i:kwəl] *adj* 1. qeyri-bərabər, bərabər olmayan; müxtəlif; **an ~ contest** qeyri-bərabər yarış; **an ~ chance** qeyri-bərabər imkan/şans; **planks of ~ length** qeyri-bərabər/müxtəlif uzunluqda olan taxtalar; 2. bərabərhüquqlu olmayan; ~ **treaty** bərabərhüquqlu olmayan müqavilə; 3. qeyri-müntəzəm, düzgün olmayan; ~ **pulsation** qeyri-müntəzəm vurma *(nəbz və s. haq.)*

**unequalled** [ʌn'i:kwəld] *adj* misilsiz, misli /tayı-bərabəri olmayan; ~ **beauty** misilsiz gözəllik

**unequivocal** [ˌʌnɪ'kwɪvəkl] *adj* 1. aydın; **to give an ~ answer** aydın cavab vermək; **the plain and ~ language of the law** qanunun sadə və aydın dili; 2. açıq, açıq-aşkar, şübhəsiz; 3. son, qəti; ~ **refusal** qəti imtina: ~ **promise** qəti vəd

**unerring** [ʌn'ə:rɪŋ] *adj* qüsursuz, eyibsiz, nöqsansız; səhvsiz; ~ **taste** qüsursuz zövq

**unerringly** [ʌn'ə:rɪŋlɪ] *adv* qüsursuz/nöqsansız/səhvsiz olaraq

**unescapable** [ʌnɪs'keɪpəbl] *adj* qaçılmaz, labüd; ~ **conclusion** qaçılmaz/labüd nəticə

**unethical** [ʌn'eθɪkl] *adj* qeyri-əxlaqi, əxlaq qaydalarına uyğun olmayan; ~ **decision** qeyri-əxlaqi qərar

**uneven** [ʌn'i:vn] *adj* 1. nahamar, hamar olmayan, kələ-kötür; ~ **surface/road** kələ-kötür səth/yol; *The ground was rough and uneven Yer bərk və kələ-kötür idi*; 2. əyri-üyrü; ~ **handwriting** əyri-üyrü əlyazısı/əlyazması; 3. xasiyyətcə müvazinətsiz; qərarsız, özünü saxlaya bilməyən; *He is a man of uneven temper O özünü saxlaya bilməyən/çılğın adamdır*; 4. qeyri-müntəzəm; ~ **breathing** qeyri-müntəzəm nəfəs alma; ~ **pulse** qeyri-müntəzəm nəbz/puls

**unevenly** [ʌn'i:vnlɪ] *adv* qeyri-müntəzəm tərzdə/surətdə, qeyri-müntəzəm olaraq

**unevenness** [ʌn'i:vnnɪs] *n* 1. nahamarlıq; kələ-kötürlük; 2. qeyri-müntəzəmlik

**uneventful** [ˌʌnɪ'ventfl] *adj* 1. hadisəsiz, sakit; ~ **life** sakit həyat; 2. adi, normal; *Recovery was uneventful Sağalma normal keçirdi*

**unexamined** [ˌʌnɪ'gzæmɪnd] *adj* 1. yoxlanılmamış, gözdən keçirilməmiş; 2. imtahan edilməmiş; 3. dindirilməmiş, istintaq edilməmiş, istintaqa cəlb edilməmiş/olunmamış

**unexceptionable** [ˌʌnɪk'sepʃənəbl] *adj* eyibsiz, nöqsansız, qüsursuz; kamil, mükəmməl; ~ **taste** kamil/mükəmməl zövq; *His taste was unexceptionable Onun zövqü kamil/qüsursuz idi*

**unexceptional** [ˌʌnɪk'sepʃənl] *adj* 1. adi, müstəsna/ qeyri-adi olmayan; 2. etiraza yer qoymayan; dəqiq; dəyişməz, daimi

**unexpected** [ˌʌnɪks'pektɪd] *adj* gözlənilməz; ~ **guests/changes/results** gözlənilməz qonaqlar/dəyişikliklər/ nəticələr

**unexpectedly** [ˌʌnɪks'pektɪdlɪ] *adv* gözlənilmədən, gözlənmədən, qəfildən; **to come/to return ~** gözlənilmədən gəlmək/qayıtmaq

**unexpectedness** [ˌʌnɪks'pektɪdnɪs] *n* gözlənilməzlik, qəfillik

**unexplained** [ˌʌnɪks'pleɪnd] *adj* izah edilməmiş, izah olunmamış, açıqlanmamış; ~ **errors/reasons** izah edilməmiş səhvlər/ səbəblər; *The disappearance of the aircraft remains unexplained Təyyarənin yox olması izah edilməmiş/açıqlanmamış qalır*

**unfading** [ʌn'feɪdɪŋ] *adj* solmaz, solmayan; unudulmayan, əbədi; ~ **glory** unudulmayan/ unudulmaz /əbədi şöhrət

**unfailing** [ʌn'feɪlɪŋ] *adj* 1. dəyişməyən, dəyişməz, daimi; sadiq, sədaqətli, vəfalı; ~ **friend** sədaqətli/ vəfalı/sadiq dost; 2. etibarlı; ~ **test** etibarlı test/ təcrübə; 3. tükənməz; **an ~ supply of water** tükənməz su ehtiyatı; ~ **courage** tükənməz cəsarət/ igidlik; ~ **patience** tükənməz səbir

**unfair** [ˌʌn'feəʳ] *adj* 1. ədalətsiz; vicdansız, alçaq; ~ **decision/judgement** ədalətsiz qərar/hökm; ~ **competition** vicdansız rəqabət; 2. şərəfsiz, namussuz; ~ **player/opponent** şərəfsiz oyunçu/rəqib; ~ **methods** şərəfsiz üsullar/metodlar; 3. əlverişsiz, əlverişli olmayan, yaramayan *(külək haq.)*

**unfaithful** [ʌn'feɪθfl] *adj* vəfasız, etibarsız, sədaqətli/vəfalı olmayan, satqın; xain, əhdi pozan, namərd; ~ **wife** vəfasız/əhdi pozan arvad; ~ **husband** xain/ vəfasız/əhdi pozan ər; ~ **friend** vəfasız/namərd/ satqın/xain dost

**unfaithfulness** [ʌn'feɪθflnɪs] *n* etibarsızlıq, vəfasızlıq; satqınlıq, xainlik, namərdlik

**unfamiliar** [ˌʌnfə'mɪlɪəʳ] *adj* tanınmayan, məlum/tanış olmayan, yad; **an ~ face** yad/tanış olmayan sifət; *His face was unfamiliar to me Onun sifəti mənə tanış deyildi*; ~ **language** tanış olmayan/yad dil; *I'm unfamiliar with this type of computer Mən bu növ kompyuterlə tanış deyiləm*

**unfashionable** [ʌn'fæʃnəbl] *adj* dəbsiz, dəbdə olmayan; ~ **clothes** dəbdə olmayan paltar/geyim

**unfasten** [ʌn'fa:sn] *v* 1. düyməni/ilməyi açmaq; **to ~ one's belt** kəmərini açmaq; **to ~ one's watch** saatını açmaq; 2. boşaltmaq; açmaq; *She unfastened the string O, kəndiri açdı*; **to ~ the bolt of a door** qapının rəzəsini açmaq



**unfathomable** [ʌn'fæðəməbl] *adj* 1. ölçülməz, ölçülməsi mümkün olmayan; ~ **depths** ölçülməsi mümkün olmayan dərinliklər; **the ocean's ~ depths** okeanın ölçülməsi mümkün olmayan dərinliyi; 2. anlaşılmaz, bilinməz; ~ **mystery** anlaşılmaz sirr

**unfathomed** [ʌn'fæðəmd] *adj* 1. ölçülməz, ölçüyəgəlməz; çox böyük; nəhəng; **the ~ might of man** insanın ölçüyəgəlməz qüdrəti; 2. dərkedilməz, sirli, sirri bilinməyən

**unfatiguable** [ˌʌnfə'ti:gəbl] *adj* yorulmaz, usanmaz, yorulmaq/usanmaq bilməyən

**unfavourable** [ʌn'feɪvərəbl] *adj* 1. qeyri-münasib, münasib olmayan, əlverişsiz, yaramayan; mənfi; ~ **wind** qeyri-münasib/əlverişsiz külək; ~ **response** mənfi cavab; 2. qərəzli, qərəzkar, bədxah; ~ **criticism** qərəzli tənqid; 3. pis, xoşagəlməz, xoşagetməz, nifrət oyadan, iyrənc; ~ **appearance** xoşagetməz/xoşagəlməz görkəm; 4. ləng, süst *(ticarət haq.)*

**unfeeling** [ʌn'fi:lɪŋ] *adj* 1. hissiz, hissini itirmiş; ölü, cansız; ~ **corpse** ölü/cansız bədən; 2. rəhmsiz, daşürəkli, vicdansız; **an ~ villain** vicdansız yaramaz

**unfeigned** [ʌn'feɪnd] *adj* həqiqi, əsl; səmimi; ~ **delight** həqiqi məftunluq/vurğunluq; **to show ~ satisfaction** həqiqi /əsl məmnuniyyət göstərmək

**unfertile** [ˌʌn'fə:taɪl] *adj* qeyri-münbit, münbit olmayan, məhsul verməyən, barsız; ~ **land** qeyri-münbit torpaq; ~ **flower** barsız çiçək

**unfetter** [ʌn'fetəʳ] *v* 1. qandalı açmaq; **to ~ a prison** dustağın qandalını açmaq; 2. azad etmək; *It unfetters the mind from prejudices of every kind Bu, insan ağlını hər cür xurafatdan/mövhumatdan azad edir*.

**unfilled** [ˌʌn'fɪld] *adj* 1. doldurulmamış, boş; ~ **bottles** doldurulmamış/boş butulkalar; ~ **seat** boş oturacaq; 2. yerinə yetirilməmiş, icra edilməmiş/olunmamış; ~ **order** yerinə yetirilməmiş sifarişlər

**unfinished** [ʌn'fɪnɪʃt] *adj* 1. bitməmiş, qurtarmamış, tamamlanmamış; **an ~ story** bitməmiş /qurtarmamış hekayə; 2. kobud, qaba, cilalanmamış, işlənməmiş, pis işlənmiş; ~ **style** cilalanmamış üslub; **an ~ article** işlənməmiş/pis işlənmiş məqalə

**unfit** [ʌn'fɪt] *adj* 1. yaramayan, müvafiq olmayan; **houses ~ for habitation** yaşayış üçün yaramayan evlər; ~ **to drink** içməyə yaramayan; 2. qabiliyyətsiz, bacarıqsız; yaramaz, yaramayan; ~ **for a doctor** həkimliyə yaramayan; *He is unfit for such a profession O bu sənətə yaramır*; 3. özünü pis hiss edən, kefsiz, naxoş; 4. yaramayan *(sağlamlığa görə)*; *He is certified as unfit for army service O, hərbi xidmətə yararsız hesab edilir*

**unfitness** [ʌn'fɪtnɪs] *n* 1. yaramazlıq, yararsızlıq; gərəksizlik; ~ **for military service** hərbi xidmətə yararsızlıq; 2. qabiliyyətsizlik, bacarıqsızlıq; acizlik; *He could not conceal his unfitness for the work O, işə qabiliyyətsizliyini/bacarıqsızlığını gizlədə bilmədi*

**unfitting** [ʌn'fɪtɪŋ] *adj* yaramayan, əlverməyən, yaramaz, yersiz, münasib olmayan; ~ **atmosphere** qeyri-münasib mühit; ~ **remark** yersiz məzəmmət

**unflagging** [ˌʌn'flægɪŋ] *adj* zəifləməyən, azalmayan, bitməz, tükənməz, əskilməyən, daimi; ~ **zeal** daimi cəhd/səy; ~ **energy** azalmayan/daimi/tükənməz enerji

**unflattering** [ʌn'flætərɪŋ] *adj* 1. həqiqi, əsl; ~ **portrait** həqiqi portret; 2. mənfi, pis; xoşagəlməz; ~ **remark** xoşagəlməz irad/məzəmmət

**unflinching** [ʌn'flɪntʃɪŋ] *adj* qətiyyətli, cəsarətli, əzmli, səbatlı, qərarından dönməyən, sarsılmaz; ~ **courage** sarsılmaz mərdlik/mətanət

**unflinchingly** [ʌn'flɪntʃɪŋlɪ] *adv* qətiyyətlə, əzmlə, cəsarətlə

**unfold** [ʌn'fould] *v* 1. açmaq; sərmək, salmaq, döşəmək; **to ~ a newspaper/a parcel** qəzeti/bağçanı açmaq; **to ~ a table-cloth** stol süfrəsini salmaq; 2. açılmaq, sərilmək, döşənmək; 3. vermək *(cücərti, zoğ)*; açmaq *(çiçək)*; 4. açmaq, bəyan etmək, söyləmək; *He unfolded to me his desire for the university O, universitetə girmək arzusunu mənə söylədi/bəyan etdi; She unfolded her plans to us O, planlarını bizə danışdı*

**unforeseen** [ˌʌnfɔ:'si:n] *adj* gözlənilməyən, qabaqcadan nəzərdə tutula bilməyən/tutulmamış; ~ **events** gözlənilməyən hadisələr; ~ **difficulties** əvvəlcədən nəzərdə tutulmamış çətinliklər

**unforgettable** [ˌʌnfə'getəbl] *adj* unudulmaz, yaddan çıxmaz/çıxmayan; **an ~ moment** unudulmaz/yaddan çıxmaz an; ~ **days** unudulmaz günlər; *We went to the village and spent unforgettable days Biz kəndə getdik və unudulmaz günlər keçirdik*

**unforgivable** [ˌʌnfə'gɪvəbl] *adj* bağışlanılmaz; ~ **behaviour** bağışlanılmaz davranış; ~ **sin** bağışlanılmaz günah

**unforgotten** [ˌʌnfə'gɔtn] *adj* unudulmamış; *He remains unforgotten O, unudulmamışdır*

**unformed** [ˌʌn'fɔ:md] *adj* 1. formalaşmamış; inkişaf etməmiş; ~ **mind** inkişaf etməmiş ağıl/zəka; **an as yet ~ government** hələ formalaşmamış hökumət; 2. forması olmayan, amorf; ~ **matters** amorf maddələr

**unfortunate**[1] [ʌn'fɔ:tʃənət] *n* 1. bədbəxt/bəxtsiz/talesiz/uğursuz adam; 2. fahişə, qəhbə

**unfortunate**[2] [ʌn'fɔ:tʃənət] *adj* 1. bəxtsiz, talesiz, bədbəxt; **a ~ person** bədbəxt/bəxtsiz/talesiz adam; 2. uğursuz; ~ **remark** uğursuz irad/tənbeh

**unfortunately** [ʌn'fɔ:tʃnɪtlɪ] *adv* bədbəxtlikdən, bədbəxtcəsinə; *I couldn't come in time, unfor-*

*tunately Bədbəxtlikdən mən vaxtında gələ bilmədim*

**unfounded** [ʌn'faundɪd] *adj* əsassız, səbəbsiz; **~ rumours/accusations** əsassız şayiələr/ittihamlar

**unfreeze** [ˌʌn'fri:z] *v (pt* **unfroze** [-'frouz]; *pp* **unfrozen** [-'frouzn]) **1**. donunu açmaq; **to ~ meat** ətin donunu açmaq; **2**. donu açılmaq; **3**. dondurmamaq *(əməkhaqqını və s.)*; **to ~ trade** ticarəti azad etmək

**unfriendliness** [ʌn'frendlınıs] *n* bədxahlıq, pisniyyətlilik, qərəzkarlıq, düşmənçilik

**unfriendly** [ʌn'frendlı] *adj* dost olmayan, qeyri-səmimi, pisniyyətli, düşmən; soyuq; **an ~ look /attitude** soyuq baxış/münasibət; *He was distinctly unfriendly towards me O açıqdan-açığa mənə düşmən idi*

**unfulfilled** [ˌʌnful'fıld] *adj* **1**. yerinə yetirilməmiş; **~ promise/task** yerinə yetirilməmiş vəd/tapşırıq; **2**. həyata keçməmiş; **~ desire** həyata keçməmiş arzu; *Our hopes remained unfulfilled Bizim ümidlərimiz həyata keçmədi/doğrulmadı*

**unfurl** [ˌʌn'fə:l] *v* **1**. açmaq *(xalçanı, bayrağı və s.)*; **to ~ a banner/a sail** bayrağı/yelkəni açmaq; **2**. çiçək/ yarpaq açmaq *(bitki və s. haq.)*; *The leaves were gradually unfurling Yarpaqlar yavaş-yavaş açılırdı*

**unfurnished** [ʌn'fə:nıʃt] *adj* **1**. təchiz edilməmiş; **2**. mebellə təchiz edilməmiş, mebelsiz *(otaq haq.)*; *The room was unfurnished Otaq mebellə təchiz olunmamışdı, Otaqda mebel yox idi*

**unfurrowed** [ˌʌn'fʌroud] *adj* şumlanmamış, sürülməmiş; **~ field** şumlanmamış tarla

**ungainliness** [ʌn'geınlınıs] *n* yöndəmsizlik, lənglik, biçimsizlik, yaraşıqsızlıq

**ungainly** [ʌn'geınlı] *adj* ağır, ləng; yöndəmsiz, biçimsiz, yaraşıqsız; **a tall ~ man** hündür biçimsiz adam

**ungodly** [ʌn'gɔdlı] *adj* **1**. allaha/dinə inanmayan, allahsız; **2**. *d.d.* pis, çox pis, dəhşətli; xoşagəlməz; **~ noise** dəhşətli/xoşagəlməz səs

**ungovernable** [ʌn'gʌvənəbl] *adj* **1**. sözə baxmayan/qulaq asmayan, itaət etməyən, itaətsiz; tərs, ipə-sapa yatmayan; **2**. tabe/ram olmayan, yola gəlməyən, azğın; **~ passion** azğın ehtiras; **a man of ~ passion** azğın ehtiraslı adam

**ungracious** [ʌn'greıʃəs] *adj* **1**. ədəbsiz, nəzakətsiz, tərbiyəsiz, qaba, kobud, sərt, soyuq; **~ remark** kobud irad/tənbeh; **to meet with an ~ reception** soyuq qarşılamaq; **2**. pis, xoşagəlməz, çirkin, iyrənc; **~ task** çirkin/iyrənc/xoşagəlməz tapşırıq; **~ duty** xoşagəlməz vəzifə

**ungraciously** [ʌn'greıʃəslı] *adv* ədəbsiz, tərbiyəsiz, qaba, kobud; soyuq, sərt

**ungrammatical** [ˌʌngrə'mætıkl] *adj* qeyri-qrammatik, qrammatik baxımdan/cəhətdən səhv; savadsız; **~ sentences** qrammatik cəhətdən səhv cümlələr

**ungrateful** [ʌn'greıtfl] *adj* nanəcib, alçaq; minnətdar olmayan; **to show oneself ~ to *smb.*** bir kəsə qarşı nanəciblik etmək



**ungratefully** [ʌn'greıtflı] *adv* nanəcibcəsinə, alçaqcasına

**unguarded** [ʌn'ga:dıd] *adj* **1**. nəzarətsiz, mühafizə edilməmiş; müdafiəsiz; *The prisoner was left unguarded Dustaq nəzarətsiz buraxıldı/qaldı*; **2**. ehtiyatsız, diqqətsiz, laqeyd; **~ remark** ehtiyatsız/ laqeyd irad

**unhappily** [ʌn'hæpılı] *adv* **1**. bədbəxt; **to live ~** bədbəxt yaşamaq; **2**. bədbəxtlikdən; *Unhappily, we couldn't find him Bədbəxtlikdən, biz onu tapa bilmədik*

**unhappiness** [ʌn'hæpınıs] *n* bədbəxtlik, bəxti gətirməmə, bəxtiqaralıq

**unhappy** [ʌn'hæpı] *adj* **(-ier, -iest) 1**. bədbəxt, bəxtsiz, bəxti gətirməyən, bəxtiqara, qarabəxt; **an ~ woman** bədbəxt/bəxtiqara/qarabəxt qadın; **2**. qəmgin, kədərli; **~ face** kədərli sifət; **3**. uğursuz, müvəffəqiyyətsiz, baş tutmayan; **~ translation** uğursuz tərcümə; **4**. yersiz; **~ remark** yersiz irad/tənbeh

**unhealthy** [ʌn'helθı] *adj* **1**. xəstə; **~ complexion** xəstə sifət rəngi; **2**. ziyanlı, səhhət üçün yaramayan; **an ~ climate** səhhət üçün yaramayan iqlim/ab-hava; **3**. antisanitar

**unheard** [ʌn'hə:d] *adj* eşidilməmiş; nəzərə alınmamış; qulaq asılmamış; *My protests went unheard Mənim etirazlarım eşidilmədi/nəzərə alınmadı*; **a previously ~ music** əvvəllər eşidilməmiş musiqi

**unheeded** [ʌn'hi:dıd] *adj* görünməmiş, nəzərə çarpmamış, nəzərə alınmayan, diqqət xaricində qalmış; **to pass ~** nəzərə çarpmadan keçib getmək; *Their warning went unheeded Onların xəbərdarlığı nəzərə alınmadı*

**unhelpful** [ʌn'helpfl] *adj* əhəmiyyətsiz, faydasız, fayda verməyən; **to make ~ suggestion** faydasız/əhəmiyyətsiz təklif etmək

**unhelpfully** [ʌn'helpfəlı] *adv* faydasız, səmərəsiz, əbəs, hədər, bihudə (olaraq)

**unheralded** [ʌn'herəldıd] *adj* gözlənilməz, gözlənilməyən; **totally ~ telegram** tamamilə gözlənilməz teleqram

**unhesitating** [ʌn'hezıteıtıŋ] *adj* tərəddüd etməyən, qətiyyətli, cəsarətli, qəti; **an ~ reply** qəti cavab

**unhesitatingly** [ʌn'hezıteıtıŋlı] *adv* qətiyyətlə, cəsarətlə, qəti olaraq; *He replied unhesitatingly O, qətiyyətlə/qəti olaraq cavab verdi*

**unhidden** [ˌʌn'hıdn] *adj* gizlədilməmiş, açıq

**unhindered** [ʌn'hındəd] *adj* sərbəst, maneəsiz

**unhinge** [ʌn'hındʒ] *v* **1**. pozmaq, xarab etmək; korlanmaq; *His nerves are completely unhinged Onun əsəbləri tamam korlanıb*; **2**. *məc.* pərt etmək, qanını qaraltmaq, kefini pozmaq; **to be ~d by grief** dərddən/kədərdən kefi pozulmaq/qanı qaralmaq

**unhistoric** [ˌʌnhıs'tɔrık] *adj* tarixi olmayan, tarixi əhəmiyyət /məna kəsb etməyən



**unhomely** [ˌʌn'houmlı] *adj* **1**. narahat, rahatlığı olmayan, səliqəsiz *(yer, otaq, mənzil haq.)*; **2**. cazibəsiz, cəlb etməyən, ürəyə yatmayan, xoşa gəlməyən

**unhurried** [ʌn'hʌrıd] *adj* tələsməyən, ağırtərpənən, astagəl, yavaş, ləng; **~ movements** yavaş /ləng hərəkətlər

**unhurt** [ʌn'hə:t] *adj* sağ-salamat; *The driver escaped unhurt Sürücü sağ-salamat ötüşdü*

**unhygienic** [ˌʌnhaı'dʒi:nık] *adj* səhiyyə tələblərinə uyğun olmayan, natəmiz, çirkli

**uni-** [ˌju:nı-] *pref Mürəkkəb sözlərin, əsasən terminlərin tərkib hissəsi; Azərbaycan türkcəsində adətən* **bir** *komponentinə uyğun gəlir:* **uni**colourous **bir**rəngli, **uni**cellular **bir**hüceyrəli, **uni**lateral **bir**tərəfli, **uni**sexual **bir**cinsiyyətli, **uni**axial **bir**oxlu

**uniaxial** [ˌju:nı'æksıəl] *adj tex.* biroxlu, birmehvərli

**unicameral** [ˌju:nı'kæmərəl] *adj* birpalatalı *(parlament haq.)*

**unicellular** [ˌju:nı'seljulə[r]] *adj biol.* birhüceyrəli

**unicity** [ju'nısıtı] *n* unikallıq, nadirlik

**unicoloured** [ˌju:nı'kʌləd] *adj* = **unicolourous**

**unicolourous** [ˌju:nı'kʌlərəs] *adj* birrəngli, saya

**unification** [ˌju:nıfı'keıʃn] *n* birləşmə; **the ~ of Azerbaijan** Azərbaycanın birləşməsi

**unified** ['ju:nıfaıd] *adj* birləşmiş; **a ~ transport system** birləşmiş nəqliyyat sistemi

**uniform[1]** ['ju:nıfɔ:m] *n* forma *(paltar)*; **school ~** məktəb forması; **a military/police ~** hərbi/polis forması; *The hat is part of (the) school uniform Papaq məktəb formasının bir hissəsidir*

**uniform[2]** ['ju:nıfɔ:m] *adj* **1**. dəyişməyən, yeknəsəq, cansıxıcı, darıxdırıcı; **~ life** yeknəsəq/cansıxıcı /darıxdırıcı həyat; **2**. eyni, bir cür; yekcins; **~ cargo** yekcins yük; **to keep the room at a ~ temperature** otağı bir cür/eyni temperaturda saxlamaq; **3**. müntəzəm, bir bərabərdə, bərabər *(sürət, hərəkət və s. haq.)*

**uniformed** ['ju:nıfɔ:md] *adj* forma geymiş; **~ schoolchildren** forma geymiş məktəb uşaqları

**uniformity** [ˌju:nı'fɔ:mıtı] *n* bircürlük, yeknəsəqlik, eynilik, oxşarlıq, həmcinslik

**unify** ['ju:nıfaı] *v (pt, pp* **-fied)** birləşdirmək; **to attempt to ~ nation** milləti birləşdirməyə səy göstərmək/etmək; **to ~ transport system** nəqliyyat sistemini birləşdirmək

**unilateral** [ˌju:nı'lætrl] *adj* birtərəfli; **~ declaration** birtərəfli deklarasiya/bəyannamə/bəyanat; **a ~ decision** birtərəfli qərar; **~ disarmament** birtərəfli tərk-silah

**unilaterally** [ˌju:nı'lætrəlı] *adv* birtərəfli; **to take a decision ~** birtərəfli qərar qəbul etmək; **to approach a problem ~** problemə birtərəfli yanaşmaq

**unimaginable** [ˌʌnı'mædʒınəbl] *adj* təsəvvür edilə bilməyən/edilməz, xəyala gətirilə bilməyən; qeyri-adi; **poverty on an ~ scale** təsəvvür edilə bilməyən miqyasda kasıblıq/yoxsulluq



**unimaginative** [ˌʌnı'mædʒınətıv] *adj* təsəvvürə/ xəyala gəlməyən; maraqsız, cansıxıcı, quru, bayağı

**unimpaired** [ˌʌnım'peəd] *adj* korlanmamış, xarab edilməmiş, pozulmamış; **~ health** korlanmamış sağlamlıq

**unimpeachable** [ˌʌnım'pi:tʃəbl] *adj* **1**. qüsursuz, eyibsiz, nöqsansız, ləkəsiz, təmiz; **~ honesty** təmiz vicdan/namus, qüsursuz düzlük; **2**. inkaredilməz, şübhəsiz, danılmaz, şəksiz, aydın, aşkar *(dəlil, hüquq və s. haq.)*

**unimpeded** [ˌʌnım'pi:dıd] *adj* maneəsiz, əngəlsiz

**unimportant** [ˌʌnım'pɔ:tnt] *adj* əhəmiyyətsiz, xırda, kiçik, balaca, cüzi; **~ details** əhəmiyyətsiz təfərrüatlar

**unimpressed** [ˌʌnım'prest] *adj* təsir oyatmayan/ doğurmayan; *I was unimpressed by his speech Onun nitqi məndə təsir doğurmadı/oyatmadı*

**unimpressive** [ˌʌnım'presıv] *adj* təsirsiz, təsiri olmayan, təsir etməyən

**unimproved** [ˌʌnım'pru:vd] *adj* **1**. yaxşılaşdırılmamış, təkmilləşdirilməmiş, düzəldilməmiş, islah edilməmiş; **2**. *k.t.* xam *(torpaq haq.)*; **3**. istifadə edilməmiş, dəyərləndirilməmiş *(fürsət, imkan və s.)*; *He left this advantage unimproved O bu imtiyazdan istifadə etmədi*

**unimpulsive** [ˌʌnım'pʌlsıv] *adj* **1**. impulsiv olmayan, iradi; **~ action** iradi hərəkət; **2**. tez coşmayan/ özündən çıxmayan/qızışmayan

**unincluded** [ˌʌnın'klu:dıd] *adj* daxil edilməmiş/ olmamış

**unincreased** [ˌʌnın'kri:st] *adj* artırılmamış, çoxaldılmamış; böyüdülməmiş

**unindifferent** [ˌʌnın'dıfrənt] *adj* laqeyd olmayan, laqeyd baxıla bilməyən; maraqlandıran, rəğbət oyadan

**unindustrious** [ˌʌnın'dʌstrıəs] *adj* zəhmət sevməyən, çalışqan olmayan, tənbəl

**uninformed** [ˌʌnın'fɔ:md] *adj* **1**. xəbərsiz, məlumatsız, məlumatı/xəbəri olmayan, məlumat/ xəbər almamış, xəbərdar olmayan; **to be ~ on *smth*.** bir şey haqqında xəbəri/məlumatı olmamaq; **2**. təlim görməmiş/keçməmiş, öyrədilməmiş

**uninhabited** [ˌʌnın'hæbıtıd] *adj* məskunlaşmamış, adam yaşamayan, əhalisi olmayan, əhalisiz; **~ islands** adam yaşamayan/əhalisi olmayan adalar

**uninitiated** [ˌʌnı'nıʃıeıtıd] *adj* xəbərdar/tanış/vaqif olmayan, nabələd, bilməyən; **an ~ reader** nabələd oxucu

**uninspired** [ˌʌnın'spaıəd] *adj* ruhlanmamış, ilham verməyən, ilhamlandırmayan, ruhlandırılmamış, şövqə gəlməmiş; solğun, cansız; **~ speech** solğun/ cansız nitq

**uninspiring** [ˌʌnın'spaıərıŋ] *adj* maraqsız, maraq doğurmayan/yaratmayan; *The book is fascinating, despite its uninspiring title Kitab, adının maraq doğurmadığına baxmayaraq, cəzbedicidir*

**unshaven** [ʌn'ʃeɪvn] *adj* qırxılmamış; **an ~ face** qırxılmamış üz
**unship** [ʌn'ʃɪp] *v* **1.** boşaltmaq *(yükü gəmidən)*; **2.** düşürmək *(sərnişinləri gəmidən)*; **3.** götürmək, qaldırmaq *(avarı, dor ağacını)*
**unskilled** [.ʌn'skɪld] *adj* ixtisassız, ixtisası olmayan; **~ workers** ixtisası olmayan/qara fəhlələr
**unsociable** [.ʌn'souʃəbl] *adj* adamayovuşmaz, adamdanqaçan, ünsiyyətsiz, adamsevməz, təklikseven
**unsocial** [.ʌn'souʃl] *adj* **1.** = **unsociable**; **2.** cəmiyyətə zidd
**unsoiled** [.ʌn'sɔɪld] *adj* **1.** çirklənməmiş, təmiz; **an ~ handkerchief** təmiz əl yaylığı; **2.** ləkəsiz, ləkələnməmiş; **an ~ name** ləkəsiz/ləkələnməmiş ad
**unsolemn** [.ʌn'sɔləm] *adj* **1.** təntənəli/dəbdəbəli/təmtəraqlı olmayan; **2.** qeyri-rəsmi, formal; **~ war** elan edilməmiş müharibə
**unsolicited** [.ʌnsə'lɪsɪtɪd] *adj* könüllü; xahişsiz; tələb olunmayan, xahiş edilməyən/olunmayan; **~ help** könüllü kömək
**unsolved** [.ʌn'sɔlvd] *adj* həll edilməmiş/olunmamış; **an ~ problem** həll edilməmiş/olunmamış problem
**unsophisticated** [.ʌnsə'fɪstɪkeɪtɪd] *adj* **1.** sadə, açıqqəlbli, açıqürəkli, sadədil, sadəlövh; **~ people** sadə/sadədil/sadəlövh/açıqürəkli adamlar; **2.** əsas; **~ methods** əsas metodlar/üsullar; **3.** saxtalaşdırılmamış, xalis, təmiz
**unsorted** [.ʌn'sɔ:tɪd] *adj* çeşidlənməmiş; **~ goods** çeşidlənməmiş mallar
**unsound** [.ʌn'saund] *adj* **1.** xəstə, naxoş, kefsiz; zəif; **~ lungs** zəif/xəstə ağ ciyərlər; *The roof is structurally unsound Dam quruluşca zəifdir*; **2.** səhv, əsaslandırılmamış, əsassız; **~ arguments** əsaslandırılmamış arqumentlər/sübutlar; **3.** etibarsız
**unsounded** [.ʌn'saundɪd] *adj* tədqiq edilməmiş, öyrənilməmiş; ölçülməmiş *(dərinlik haq.)*; **the ~ depths of human misery** insan əzabının nəhayətsiz /ölçüsüz dərinliyi
**unsown** [.ʌn'soun] *adj* səpilməmiş
**unsparing** [.ʌn'speərɪŋ] *adj* **1.** amansız, rəhmsiz, insafsız, zalım, qəddar, mürvətsiz; **to be ~** amansız /rəhmsiz/insafsız olmaq; *He is unsparing of others O başqalarına qarşı amansızdır/rəhmsizdir/ qəddardır*; **2.** səxavətli, əliaçıq; tələfxərc; **to be ~** səxavətli/ əliaçıq olmaq; **3.** çalışqan, işə can yandıran, səyli; **an ~ pupil** çalışqan şagird
**unspeakable** [ʌn'spi:kəbl] *adj* **1.** sözlə deyilə/ifadə edilə bilməyən, son dərəcə güclü/böyük /çox; **~ delight** sözlə deyilə bilməyən/təsvirə gəlməyən həzz/ləzzət; **~ bore** təsvirəgəlməz sıxıntı/darıxma/ üzüntü; **~ cruelty** sözlə təsviredilməz qəddarlıq/ amansızlıq; **2.** çox pis/iyrənc; **~ odour** çox iyrənc / pis iy
**unspeakably** [ʌn'spi:kəblɪ] *adv* təsvirəgəlməz dərəcədə, sözlə ifadəedilməyəcək surətdə; çox pis/iyrənc
**unspecified** [.ʌn'spesɪfaɪd] *adj* naməlum, dəqiq təyin edilməmiş/müəyyənləşdirilməmiş; *The story takes place at an unspecified date Əhvalat naməlum vaxtda/tarixdə baş verir*
**unspectacular** [.ʌnspek'tækjulə] *adj* adi, təmtəraqsız; **a nice but ~ wedding** gözəl, ancaq adi toy
**unstable** [ʌn'steɪbl] *adj* **1.** davamsız, möhkəm olmayan; tezsınan; **~ walls/chairs** davamsız divarlar /stullar; **~ peace** davamsız sülh; **2.** dəyişkən, dəyişən; **~ climate** dəyişkən iqlim/ab-hava; **~ situation** dəyişən vəziyyət
**unstated** [ʌn'steɪtɪd] *adj* **1.** elan edilməmiş, xatırladılmamış; **2.** formalaşdırılmamış; izah/şərh edilməmiş; **~ reasons** izah edilməmiş səbəblər
**unsteady** [ʌn'stedɪ] *adj* **(-ier, -iest) 1.** möhkəm olmayan, dayanıqsız; laxlayan, tərpənən; əsən, titrəyən; **an ~ hand** əsən /titrəyən əl; **~ voice** titrəyən səs; **an ~ ladder** möhkəm olmayan/dayanıqsız nərdivan; *She is still unsteady on her feet after the illness Xəstəlikdən sonra o hələ də ayaq üstə güclə dayanır*; **2.** dəyişkən, dəyişən, səbatsız; qeyri-sabit; **an ~ pulse** qeyri-sabit nəbz
**unsteadily** [ʌn'stedɪlɪ] *adv* əsə-əsə, titrəyə-titrəyə, titrək, qeyri-sabit; səndələyə-səndələyə; **to walk ~** əsə-əsə/səndələyə-səndələyə yerimək
**unsteadiness** [ʌn'stedɪnɪs] *n* dayanıqsızlıq, qeyri-sabitlik; səbatsızlıq, dəyişkənlik, titrəyiş; *I hoped he wouldn't hear the unsteadiness in my voice Mən ümid edirdim ki, o mənim səsimdəki titrəyişi hiss etməyəcək*
**unsteel** [ʌn'sti:l] *v* yumşaltmaq, rəhmə gətirmək; **to ~ smb.'s heart** bir kəsin ürəyini yumşaltmaq
**unstiffen** [ʌn'stɪfn] *v* **1.** yumşaltmaq; bərkliyini azaltmaq; **2.** yumşalmaq; *Her rigid face unstiffened Onun sərt sifəti yumşaldı*
**unstinted** [.ʌn'stɪntɪd] *adj* hədsiz, hüdudsuz, sonsuz, nəhayətsiz; ölçüyəgəlməz; **to excite ~ admiration** hədsiz heyranlıq törətmək/doğurmaq
**unstinting** [ʌn'stɪntɪŋ] *adj* hədsiz, hüdudsuz, həddən artıq/çox; **~ generosity** hədsiz mərdlik /alicənablıq/ comərdlik/nəciblik; **~ support** hədsiz /hüdudsuz yardım/arxa; **~ praise** hədsiz/həddən artıq tərif
**unstintingly** [ʌn'stɪntɪŋlɪ] *adv* həddən artıq, lap çox, hədsiz dərəcədə; *She worked unstintingly to help homeless people O, evsiz adamlara kömək etmək üçün çox/həddən artıq işlədi*
**unstirred** [.ʌn'stə:d] *adj* **1.** təmkinli, soyuqqanlı, təlaşa düşməyən, təlaş keçirməyən, özünü itirməyən; **2.** qarışdırılmamış



**unstitch** [ʌn'stɪtʃ] *v* sökmək *(tikişi)*; **to come ~ed** sökülmək *(tikiş haq.)*
**unstop** [ʌn'stɔp] *v* **1.** açmaq *(yolu və s.)*, maneəni aradan qaldırmaq/götürmək; **2.** ağzını açmaq, probkasını çıxartmaq *(şüşənin və s.)*; **3.** plombu çıxartmaq *(dişdən)*
**unstoppable** [ʌn'stɔpəbl] *adj* qarşısıalınmaz, qarşısı alına bilməyən, dayandırıla bilməyən; **an ~ rise in prices** qiymətlərdə qarşısıalınmaz qalxma/yüksəlmə
**unstopped** [ʌn'stɔpt] *adj* **1.** maneəsiz, əngəlsiz, sərbəst; **2.** bağlanmamış, açıq; **3.** probkası çıxarılmış, ağzı açılmış *(şüşə və s. haq.)*; **4.** plomb qoyulmamış, plomblanmamış *(diş haq.)*; **5.** *fon.* partlamayan *(səs haq.)*
**unstrap** [ʌn'stræp] *v* açmaq, boşaltmaq *(kəməri və s.)*
**unstressed** [.ʌn'strest] *adj* **1.** vurğusuz, vurğusu olmayan *(heca, söz haq.)*; **2.** vurğulanmayan, nəzərə çarpdırılmayan
**unstripped** [.ʌn'strɪpt] *adj* **1.** çılpaqlaşdırılmamış, soyundurulmamış; **2.** yarpağı/qabığı sıyrılmamış *(ağac haq.)*
**unstudied** [.ʌn'stʌdɪd] *adj* **1.** öyrənilməmiş, tədqiq edilməmiş; **2.** məlumatı olmayan, bixəbər *(bir şeydən)*; *He is unstudied in Latin O, latın dilindən bixəbərdir, O, latın dilini bilmir*; **3.** təbii, sərbəst; **~ pose** sərbəst / təbii poza / duruş
**unstudious** [.ʌn'stjudɪəs] *adj* səysiz, səy göstərməyən, tənbəl, işə can yandırmayan
**unstylish** [.ʌn'staɪlɪʃ] *adj* modda/dəbdə olmayan, moddan/dəbdən çıxmış/düşmüş
**unsubmissive** [.ʌnsəb'mɪsɪv] *adj* itaətsiz, itaət etməyən, tabe olmayan, boyun əyməyən, dikbaş
**unsubstantial** [.ʌnsəb'stænʃl] *adj* **1.** boş, mənasız, cəfəng; **2.** qeyri-maddi, mücərrəd, mənəvi; **3.** real olmayan, qeyri-real; **~ hopes** real olmayan/qeyri-real ümidlər; **4.** davamsız, tezdağılan; **~ building** davamsız bina; **5.** qidasız, qidalı olmayan; **~ meal** qidasız yemək
**unsubstantiated** [.ʌnsəb'stænʃɪeɪtɪd] *adj* sübut edilməmiş, sübuta yetirilməmiş; təsdiq edilməmiş/olunmamış; **~ report** təsdiq edilməmiş məlumat
**unsuccessful** [.ʌnsək'sesfl] *adj* uğursuz, müvəffəqiyyətsiz, səmərəsiz, nəticəsiz; boş; **~ efforts** uğursuz/səmərəsiz/boş cəhdlər; *His efforts to get a job were unsuccessful Onun iş tapmaq cəhdləri səmərəsiz/uğursuz oldu*
**unsuccessfully** [.ʌnsək'sesflɪ] *adv* nəticəsiz/səmərəsiz olaraq, boş/bihudə yerə
**unsufferable** [.ʌn'sʌfərəbl] *adj* dözülməz, qatlaşılmaz, bərk, şiddətli; **~ cold** dözülməz/bərk/şiddətli soyuq; **~ pain** dözülməz/qatlaşılmaz /şiddətli ağrı
**unsuitability** [ʌn'sju:təbɪlɪtɪ, *amer.* -su:-] *n* yaramamazlıq, əlverişli/münasib olmama; yararsızlıq
**unsuitable** [ʌn'sju:təbl, amer. -su:-] *adj* yaramayan, yararlı olmayan, əl verməyən, əlverişli /münasib olmayan; yararsız; **an ~ article for export** ixrac edilməyə yaramayan mal; **films that are ~ for children** uşaqlar üçün yaramayan/münasib olmayan filmlər
**unsuited** [ʌn'sju:tɪd, *amer.* -su:-] *adj* **(to, for)** uyğun olmayan / gəlməyən, yaramayan, müvafiq olmayan/gəlməyən; **a garment ~ to the climate** iqlimə /ab-havaya uyğun olmayan/gəlməyən paltar
**unsullied** [ʌn'sʌlɪd] *adj* ləkəsiz, ləkələnməmiş, təmiz; **~ reputation** ləkələnməmiş/ləkəsiz/təmiz ad/şöhrət
**unsung** [.ʌn'sʌŋ] *adj* **1.** oxunmamış *(mahnı haq.)*; **2.** *şair.* tərifiənməmiş, tərənnüm/mədh edilməmiş; **the ~ heroes of the war** müharibənin tərənnüm edilməmiş qəhrəmanları
**unsupportable** [.ʌnsə'pɔ:təbl] *adj* dözülməz, qatlaşılmaz, bərk, şiddətli; yolverilməz
**unsupported** ['ʌnsə'pɔ:tɪd] *adj* **1.** kömək/müdafiə edilməmiş, müdafiəsiz, köməksiz; **a naval attack ~ by aircraft** təyyarələr tərəfindən kömək edilməmiş hərbi-dəniz qüvvələrinin hücumu; **2.** dayaqsız, dayaq vurulmamış/qoyulmamış; **sections of a structure left ~** binanın dayaqsız qalmış hissələri
**unsure** [.ʌn'ʃuə] *adj* **1.** inamsız, qətiyyətsiz, mütərəddid; şübhəli; tərəddüd edən; **to be ~ of oneself** özünə inamsız olmaq; qətiyyətsizlik göstərmək; *He's rather unsure of himself O özünə çox inamsızdır, O, qətiyyətsizdir*; **2.** qeyri-müəyyən; **3.** əmin olmayan; *I'm unsure of the fact Mən dəlildən/faktdan əmin deyiləm*
**unsurmountable** [.ʌnsə'mauntəbl] *adj* dəfedilməz, keçilməz; **~ obstacle** dəfedilməz/keçilməz manеə
**unsurpassed** [.ʌnsə'pa:st] *adj* misilsiz, tayı-bərabəri olmayan; son dərəcə
**unsurprised** [.ʌnsə'praɪzd] *adj* **(at/by *smth.*)** təəccüblənməmiş, heyrətlənməmiş; təəccübləndirilməmiş, heyrətləndirilməmiş; *We were unsurprised to find the house empty Evi boş gördükdə biz təəccüblənmədik*
**unsurprising** [.ʌnsə'praɪzɪŋ] *adj* təəccüb doğurmayan, təəccübə səbəb olmayan; **an ~ event** təəccüb doğurmayan hadisə
**unsuspected** [.ʌnsəs'pektɪd] *adj* **1.** şübhə doğurmayan /yaratmayan; **2.** gözlənilməyən, nəzərdə tutulmayan; əvvəllər məlum olmayan; *Then an unsuspected problem arose Sonra gözlənilməz problem çıxdı*; **~ turnings in roadways** yolda gözlənilməyən döngələr
**unsuspecting** [.ʌnsəs'pektɪŋ] *adj* şübhələnməyən, hər şeyə inanan, sadəlövh; **the ~ public** sadəlövh camaat/xalq

**unsweetened** [ˌʌn'swi:tnd] *adj* şirinləşdirilməmiş; şirni qatılmamış; ~ **orange juice** şirni qatılmamış portağal şirəsi/suyu
**unswept** [ˌʌn'swept] *adj* süpürülməmiş, süpürülüb təmizlənməmiş
**unswerving** [ʌn'swə:vıŋ] *adj* daimi, sarsılmaz; ~ **loyalty** sarsılmaz sədaqət/vəfa; ~ **belief** sarsılmaz inam/etiqad
**unswore** [ʌn'swɔ:ʳ] **to unswear** *felinin pt forması*
**unsworn**[1] [ʌn'swɔ:n] *adj* 1. and içməmiş, and içdirilməmiş; ~ **witness** and içdirilməmiş şahid; 2. and içməklə təsdiq edilməmiş
**unsworn**[2] [ʌn'swɔ:n] **to unswear** *felinin pp forması*
**unsyllabic** [ˌʌnsı'læbık] *adj fon.* heca yaratmayan/ düzəltməyən *(səs haq.)*
**unsymmetrical** [ˌʌnsı'metrıkl] *adj* asimmetrik, simmetriyasız, uyğunsuz
**unsympathetic** [ˌʌn.sımpə'θetık] *adj* 1. şəfqət göstərməyən, acımayan, dərdə şərik olmayan, canı/ ürəyi yanmayan; hüsn-rəğbət bəsləməyən; daşürəkli, hissiz, mərhəmətsiz; 2. qanısoyuq, çiyrəndirici, məlahətsiz, qanışirin/suyuşirin olmayan, xoşa gəlməyən, simpatiya doğurmayan, yapışıqsız
**unsystematic** [ˌʌn.sıstə'mætık] *adj* qeyri-sistematik, qeyri-müntəzəm, ardıcıl/müntəzəm olmayan; *He does his work in an unsystematic manner O, işini sistematik görmür*
**unsystematically** [ˌʌn.sıstə'mætıkəlı] *adv* qeyri-sistematik/qeyri-müntəzəm olaraq, müntəzəm olmayaraq
**unsystematized, -ised** [ˌʌn'sıstımətaızd] *adj* sistemləşdirilməmiş, sistemə salınmamış
**untainted** [ʌn'teıntıd] *adj* xarab edilməmiş; ləkələnməmiş, təmiz; **a politician ~ by scandal** rüsvayçılıqla ləkələnməmiş siyasətçi
**untaken** [ˌʌn'teıkn] *adj* götürülməmiş, alınmamış, istifadə edilməmiş; **an ~ city** alınmamış şəhər; *He left no untaken opportunity Onun istifadə etmədiyi imkan qalmadı, O bütün imkanlardan istifadə etdi*
**untalented** [ˌʌn'tæləntıd] *adj* istedadsız; qabiliyyətsiz, bacarıqsız, fərsiz, fərasətsiz; **an ~ actor** istedadsız aktyor
**untamed** [ˌʌn'teımd] *adj* 1. öyrədilməmiş, vəhşi; 2. qarşısıalınmaz, kəskin, şiddətli; azğın; ~ **passion** qarşısıalınmaz/şiddətli ehtiras; 3. becərilməmiş, xam *(torpaq haq.)*
**untangle** [ˌʌn'tæŋgl] *v* 1. açmaq; **to ~ a knot** düyünü açmaq; 2. aşkarlamaq, aşkar etmək; **to ~ a mystery** sirri aşkar etmək/aşkarlamaq
**untapped** [ˌʌn'tæpt] *adj* istifadə edilməmiş, toxunulmamış, əldəymömiş; ~ **resources** istifadə edilməmiş/toxunulmamış mənbələr; **an ~ talent** istifadə olunmamış istedad
**untaught** [ˌʌn'tɔ:t] *adj* 1. öyrədilməmiş, təhsil/təlim verilməmiş; təhsil/təlim görməmiş; cahil, avam; 2. təbii, anadangəlmə; ~ **kindness** anadangəlmə mehribanlıq/rəhmdillik/mərhəmət
**untaxed** [ˌʌn'tækst] *adj* vergidən azad, vergi qoyulmamış
**untenable** [ʌn'tenəbl] *adj* 1. yararsız, yaramayan, yaramaz *(yaşayış üçün)*, yaşayış üçün yaramayan; 2. əsassız, sübutsuz, tutarsız *(nəzəriyyə və s. haq.)*; ~ **arguments** əsassız/ sübutsuz arqumentlər/dəlillər
**untested** [ˌʌn'testıd] *adj* yoxlanılmamış, sınanmamış, sınaqdan/təcrübədən keçirilməmiş; **an ~ theory** sınaqdan/təcrübədən keçirilməmiş nəzəriyyə; ~ **medical treatment** sınaqdan/təcrübədən keçirilməmiş tibbi müalicə
**unthankful** [ʌn'θæŋkfl] *adj* naşükür, nankor, yaxşılıq bilməyən
**unthinkable** [ʌn'θıŋkəbl] *adj* təsəvvürə gəlməz/gəlməyən, təsəvvür edilə bilməyən; ağlasığmaz, təsəvvüredilməz; ~ **joy** ağlasığmaz/təsəvvüredilməz sevinc; *Defeat was unthinkable Məğlubiyyət ağlasığmaz idi*
**unthinking** [ʌn'θıŋkıŋ] *adj* 1. qayğısız, fikirsiz, dəmdəməki, yelbeyin, arsız, yüngül; 2. düşüncəsiz, ağılsız; 3. mənasız, boş *(nöqteyi-nəzər və s. haq.)*; ~ **remarks** mənasız/boş iradlar; ~ **criticisms** mənasız/ boş tənqidlər
**untidily** [ʌn'taıdılı] *adv* səliqəsiz, natəmiz, səliqəsiz /natəmiz bir tərzdə
**untidiness** [ʌn'taıdınıs] *n* pintilik, natəmizlik, çirklilik, səliqəsizlik
**untidy** [ʌn'taıdı] *adj* **(-ier, -iest)** səliqəsiz, pinti, natəmiz, çirkli; **an ~ desk/room** səliqəsiz yazı stolu/otaq; **an ~ kitchen** natəmiz/çirkli mətbəx; ~ **writing** səliqəsiz yazı; **an ~ child** pinti/natəmiz uşaq
**untie** [ʌn'taı] *v* 1. açmaq; **to ~ a rope/a ribbon/a parcel** kəndiri/lenti/bağlamanı açmaq; **to ~ a horse from the tree** atı ağacdan açmaq; *He untied the horse from the tree O, atı ağacdan açdı*; 2. açılmaq; *The rope/ribbon untied Kəndir/Lent açıldı*; 3. azad etmək; **to ~ a prisoner** dustağı azad etmək
**untied** [ʌn'taıd] *adj* açılmış; bağlanmamış
**until**[1] [ʌn'tıl] *prep* ...-a/...-ə, ...kimi/qədər, ...-dək; ~ **five o'clock** saat beşə kimi/qədər, saat beşədək; *It rained until five o'clock Saat beşə kimi/qədər yağış yağdı*
**until**[2] [ʌn'tıl] *conj* 1. ...-na/...-nə, ...qədər/kimi; *They worked until the work finished İş qurtarana qədər/ kimi onlar işlədilər; They worked until it got dark Onlar qaranlıq düşənə qədər /kimi işlədilər; Let's wait until the rain stops Gəl/Gəlin yağış kəsənə kimi/qədər gözləyək*; 2. ...-dan/...-dən sonra; *He did not arrive until the concert was over O, konsert qurtarandan sonra gəldi; She didn't reach the station until the train had left O, stansiyaya qatar yola düşdükdən sonra çatdı*



**untilled** [ˌʌn'tıld] *adj* şumlanmamış, sürülməmiş; becərilməmiş; ~ **land** xam torpaq
**untimely**[1] [ʌn'taımlı] *adj* 1. vaxtsız; ~ **death** vaxtsız ölüm; 2. yersiz, yerinə düşməyən; **an ~ remark/criticism** yersiz irad/tənqid
**untimely**[2] [ʌn'taımlı] *adv* 1. vaxtından əvvəl/qabaq; 2. yersiz, yerli-yersiz
**untitled** [ˌʌn'taıtld] *adj* 1. titulu olmayan, titul verilməmiş; 2. adsız, sərlövhəsiz; **an ~ poem** adsız/sərlövhəsiz şer; 3. ixtiyarsız, ixtiyarı olmayan, səlahiyyətsiz, səlahiyyəti olmayan
**unto** ['ʌntə, -tʊ] *prep arx* 1. ...-a/...-ə kimi/qədər; ~ **death** ölənə qədər/kimi; **to swear to be faithful ~ death** ölənə qədər/kimi sadiq qalmağa /olmağa and içmək; 2. ...-a/...-ə tərəf; **to turn ~ smb.** bir kəsə tərəf dönmək; **to press smb. ~ one's heart** bir kəsi üreyinə sıxmaq
**untold** [ˌʌn'tould] *adj* 1. deyilməmiş, söylənilməmiş, danışılmamış; *He left the story untold O bu əhvalatı danışmadı*; 2. deyilməsi/danışılması mümkün olmayan; olmazın; ~ **suffering** danışılması/deyilməsi mümkün olmayan əzab /əziyyət, olmazın əzab-əziyyət; 3. sayılması mümkün olmayan, sayagəlməz, çox böyük; ~ **wealth** saysız-hesabsız var/var-dövlət; ~ **losses** sayagəlməz/çox böyük itki
**untouchable** [ʌn'tʌtʃəbl] *adj* 1. toxunulmaz, müqəddəs; tənqid edilə bilməyən; 2. əlçatmaz, əlyetməz, əldə edilməsi mümkün olmayan
**untouched** [ʌn'tʌtʃt] *adj* 1. toxunulmamış, əldəyməmiş; **to leave *one's* meal** ~ yeməyinə əl vurmamaq/dəyməmək; *He left his meal untouched O, xörəyinə əl vurmadı*; 2. ziyan verilməmiş/görməmiş; *Some buildings were left untouched by the storm Bəzi binalara tufandan ziyan dəymədi, Tufan bəzi binalara ziyan vermədi/vurmadı*
**untoward** [ˌʌntə'wɔ:d, *amer.* ʌn'tɔ:rd] *adj* 1. uğursuz, arzu edilməyən, xoşagəlməz, əlverişsiz; ~ **conditions** əlverişsiz şərtlər; **to make an ~ choice** uğursuz/əlverişsiz seçim etmək; *We all behaved as if nothing untoward had happened Biz hamımız elə davranırdıq ki, sanki xoşagəlməz heç nə baş verməyib*; 2. yersiz, yaramaz, münasibətsiz
**untrained** [ˌʌn'treınd] *adj* 1. öyrədilməmiş, hazırlanmamış; alışdırılmamış, alışmamış, məşq görməmiş; 2. ixtisas/xüsusi hazırlıq tələb etməyən; 3. bacarıqsız, qabiliyyətsiz
**untreated** [ˌʌn'tri:tıd] *adj* müalicə olunmamış/edilməmiş *(xəstəlik və s. haq.)*; *If untreated, the illness can become severe Müalicə edilməsə, xəstəlik ağırlaşa bilər*
**untried** [ˌʌn'traıd] *adj* yoxlanılmamış, təcrübədən keçirilməmiş; ~ **actors** yoxlanılmamış /təcrübədən keçirilməmiş aktyorlar; *He chose two untried actors for the leading roles O, baş rollar üçün iki yoxlanılmamış aktyor seçdi*
**untroubled** [ʌn'trʌbld] *adj* 1. narahat edilməmiş, əndişəyə salınmamış; nigaran qoyulmamış, təşvişə/təlaşa salınmamış; 2. sakit, rahat; **the ~ surface of a lake** gölün sakit səthi
**untrue** [ʌn'tru:] *adj* 1. vəfasız, sədaqətsiz, etibarsız; **to be ~ to *smb.*** bir kəsə qarşı vəfasız/etibarsız olmaq; *She was untrue to her husband O, ərinə qarşı vəfasız/etibarsız oldu*; 2. yalan, yanlış, səhv, saxta, uydurma; **an ~ information** yalan/uydurma məlumat; *It's absolutely untrue Bu tamamilə yalandır/uydurmadır*; 3. uyğun /müvafiq gəlməyən *(bir şeyə)*; ~ **to type** nümunəyə uyğun gəlməyən
**untruly** [ʌn'tru:lı] *adv* yanlış/səhv olaraq, düzgün /dürüst olmayaraq
**untrustworthy** [ʌn'trʌstwə:ðı] *adj* etibarsız, etibar edilə bilməyən; **an ~ person** etibarsız adam; **to take facts from ~ authorities** faktları etibarsız mənbələrdən almaq
**untruth** [ˌʌn'tru:θ] *n* (*pl* **-truths** [-'tru:ðz]) yalan, uydurma; *He never told an untruth in his life O, ömründə heç vaxt yalan danışmadı*
**untruthful** [ʌn'tru:θfl] *adj* 1. yalan, uydurma; ~ **report** yalan/uydurma məlumat/xəbər/raport; ~ **claims** uydurma tələblər; 2. yalançı; **an ~ man** yalançı adam
**untruthfully** [ʌn'tru:θfəlı] *adv* yalan, yalandan, yalan/ uydurma olaraq
**untypical** [ʌn'tıpıkl] *adj* qeyri-tipik, qeyri-səciyyəvi, tipik/səciyyəvi olmayan; **an ~ example** qeyri-tipik/tipik olmayan misal
**untune** [ʌn'tju:n] *v* 1. kökdən salmaq *(musiqi aləti və s.)*; 2. pərt etmək, kefini pozmaq, ovqatını təlx etmək, qanını qaraltmaq
**untuned** [ʌn'tju:nd] *adj* kökdən salınmış, köklənməmiş *(musiqi aləti və s. haq.)*
**untwine** [ʌn'twaın] *v* 1. açmaq, boşaltmaq; 2. açılmaq; boşalmaq; 3. qırmaq, pozmaq; **to ~ the ties of friendship** dostluq əlaqələrini qırmaq
**untwist** [ʌn'twıst] *v* açmaq; **to ~ a knot** düyünü açmaq
**ununderstandable** ['ʌn.ʌndə'stændəbl] *adj* başadüşülməz, başadüşülməyən, anlaşılmaz, anlaşılmayan; müəmmalı; **an ~ word/sentence** başadüşülməz/başadüşülməyən söz/cümlə
**ununited** [ˌʌnju'naıtıd] *adj* birləşdirilməmiş, birləşməmiş, ayrı; ~ **fracture** *tib.* bitişməmiş sınıq
**unusable** [ˌʌn'ju:zəbl] *adj* istifadə oluna bilməyən, istifadəyə yararsız; **an ~ typewriter/car, etc.** istifadəyə yararsız yazı makinası/maşın və s.; *My car is unusable Mənim maşınım istifadəyə yararsızdır*
**unused** [ˌʌn'ju:zd] *adj* istifadə edilməmiş/olun-

mamış; işlənməmiş, işlədilməmiş; **an ~ envelope/stamp** istifadə edilməmiş zərf/marka; **~ annual leave** istifadə edilməmiş illik məzuniyyət

**unuseful** [ˌʌn'ju:sfl] *adj* faydasız, səmərəsiz, xeyirsiz; boş, nahaq, bihudə; **~ efforts** faydasız/səmərəsiz/bihudə cəhdlər

**unusual** [ˌʌn'ju:ʒuəl] *adj* **1.** fövqəladə, qeyri-adi, görünməmiş, qəribə; **~ events** qeyri-adi hadisələr; **2.** çox gözəl/qəşəng/yaxşı; **a singer with ~ voice** çox gözəl/yaxşı səsi olan müğənni

**unusually** [ˌʌn'ju:ʒuəli] *adv* fövqəladə, son dərəcə; müstəsna/görünməmiş dərəcədə; **an ~ high/low rainfall for January** yanvar ayı üçün görünməmiş dərəcədə çox /az yağış

**unutterable** [ˌʌn'ʌtrəbl] *adj* görünməmiş, sözə/təsvirə gəlməyən, sözlə ifadə edilə bilməyən; **~ sadness/joy** sözlə ifadə edilə bilməyən kədər/sevinc

**unvalued** [ˌʌn'vælju:d] *adj* **1.** qiymətləndirilməmiş, qiymət qoyulmamış; **2.** hörmətsiz, hörməti olmayan, hörmət edilməyən

**unvarnished** [ʌn'va:nɪʃt] *adj* laklanmamış, lak vurulmamış/çəkilməmiş; **~ floor** laklanmamış /lak çəkilməmiş döşəmə

**unveil** [ˌʌn'veɪl] *v* **1.** duvağı açmaq; *The bride unveiled (herself) at the end of the wedding ceremony Toyun/Toy mərasiminin sonunda gəlin duvağını açdı*; **2.** örtüyü açmaq; **to ~ a statue /monument/portrait** heykəlin/abidənin/portretin örtüyünü açmaq; **3.** göstərmək, nümayiş etdirmək; **to ~ new models at the Motor Show** maşın sərgisində yeni modellər nümayiş etdirmək

**unvoiced** [ˌʌn'vɔɪst] *adj* **1.** səssiz, danışıqsız; **~ pact between us** bizim aramızda danışıqsız razılıq; **2.** *fon.* kar *(səs haq.)*

**unwaged** [ˌʌn'weɪdʒd] *adj* haqqı ödənilməmiş/verilməyən *(iş haq.)*

**unwanted** [ˌʌn'wɒntɪd] *adj* istənilməyən, arzu edilməyən, arzuedilməz; yolverilməz; lazımsız, lüzumsuz, lazım olmayan; artıq; **an ~ pregnancy** arzu edilməyən/istənilməyən hamiləlik

**unwarmed** [ˌʌn'wɔ:md] *adj* isidilməmiş; **~ rooms** isidilməmiş otaqlar

**unwarned** [ˌʌn'wɔ:nd] *adj* xəbər verilməmiş, xəbərdar edilməmiş; yanlış rəylərə əsaslanmayan

**unwary** [ˌʌn'weəri] *adj* ehtiyatsız, diqqətsiz, laqeyd; **an ~ man** ehtiyatsız/diqqətsiz adam

**unwashed** [ˌʌn'wɒʃt] *adj* yuyulmamış; **a pile of ~ dishes** bir qalaq/yığın yuyulmamış qab-qacaq

**unwatched** [ˌʌn'wɒtʃt] *adj* görünməyən, nəzarət/mühafizə edilməyən

**unwatchful** [ˌʌn'wɒtʃfl] *adj* **1.** diqqətsiz; etinasız, saymaz; **2.** ehtiyatsız; sayıq olmayan

**unwatered** [ˌʌn'wɔ:təd] *adj* **1.** susuz, suyu olmayan; sulanmayan; **~ desert** susuz/suyu olmayan səhra; **2.** su qatılmamış; **~ alcohol** su qatılmamış/təmiz spirt

**unwelcome** [ʌn'welkəm] *adj* **1.** çağırılmamış, arzuolunmaz, arzu olunmayan; **an ~ guest** çağırılmamış qonaq; **2.** xoşagəlməz, xoşagəlməyən, pis; **~ news** xoşagəlməz/pis xəbər

**unwell** [ʌn'wel] *adj* xəstə, naxoş, pis; **to feel ~** özünü xəstə/pis hiss etmək; *She said that she was feeling unwell and went home O dedi ki, özünü pis hiss edir və evə getdi*

**unwhitewashed** [ˌʌn'waɪtwɔʃt] *adj* ağardılmamış; **~ walls** ağardılmamış divarlar

**unwholesome** [ˌʌn'houlsəm] *adj* **1.** ziyanlı, zərərli, faydasız, faydası/sərfəli olmayan; **~ food** faydasız yemək; **an ~ book** faydasız/ziyanlı kitab; **an ~ climate** faydasız/ziyanlı iqlim/ab-hava; **2.** çox pis, nifrət oyadan, iyrənc, mənfur

**unwilling** [ʌn'wɪlɪŋ] *adj* həvəssiz, həvəsi olmayan; *The public are usually unwilling to accept change Xalq adətən dəyişikliyi həvəssiz qəbul edir*

**unwillingly** [ʌn'wɪlɪŋlɪ] *adv* həvəssiz; **to agree ~ to a request** xahişlə həvəssiz razılaşmaq; **to accept an invitation ~** dəvəti həvəssiz qəbul etmək

**unwillingness** [ʌn'wɪlɪŋnɪs] *n* həvəssizlik, istəməmə; *His unwillingness to accept the truth annoyed me Onun həqiqəti qəbul etməməsi məni əsəbiləşdirdi*

**unwind** [ˌʌn'waɪnd] *v (pt, pp* **unwound** [ˌʌn'waund]) **1.** açmaq *(yumağı və s.)*; **to ~ a ball of wool/a reel of thread** bir yumaq yun ipliyini/bir tağalaq sapı açmaq; *He unwound the scarf from his neck O, şərfi boynundan açdı*; **2.** açılmaq; *The rope unwound and the boat drifted away Kəndir açıldı və qayıq üzüb getdi*; **3.** özünə gəlmək, sakitləşmək; *After a few drinks, he began to unwind and talk more openly Bir az içkidən sonra o özünə gəldi/sakitləşdi və daha açıq danışmağa başladı*

**unwinged** [ˌʌn'wɪŋd] *adj* qanadsız, qanadı olmayan

**unwise** [ˌʌn'waɪz] *adj* ağılsız, düşüncəsiz, axmaq, sarsaq; gic; **an ~ decision** ağılsız/düşüncəsiz /axmaq qərar; **an ~ step** düşüncəsiz/ağılsız addım; *It was unwise to reject his offer Onun təklifini rədd etmək ağılsızlıq/axmaqlıq idi*

**unwisely** [ˌʌn'waɪzlɪ] *adv* ağılsız, ağılsızcasına, düşüncəsiz, axmaqcasına, sarsaqcasına; **to speak ~** ağılsız /düşüncəsiz danışmaq

**unwished** [ˌʌn'wɪʃt] *adj* istənilməyən, istənilməz, arzuedilməz, arzu edilməyən/olunmayan; xoşagəlməyən

**unwithering** [ˌʌn'wɪðərɪŋ] *adj* solmaz, solmayan; **~ flowers** solmayan çiçəklər

**unwitnessed** [ˌʌn'wɪtnɪst] *adj* şahidliklə təsdiq edilməmiş/olunmamış; **~ legal document** təsdiq edilməmiş/olunmamış qanuni sənəd



**unwitty** [ʌn'wɪtɪ] *adj* hazırcavab/ağıllı/fərasətli olmayan; ağılsız, fərasətsiz

**unwomanly** [ʌn'wumənlɪ] *adj* qadına yaraşmayan/layiq olmayan; **an ~ behaviour** qadına yaraşmayan davranış

**unwonted** [ʌn'wountɪd] *adj* qeyri-adi, adət edilməmiş, alışılmamış, öyrənilməmiş; **~ generosity** qeyri-adi səxavət/əliaçıqlıq/comərdlik

**unwooded** [ˌʌn'wudɪd] *adj* meşəsiz, meşə ilə örtülməmiş; **~ mountains** meşəsiz dağlar

**unwordable** [ˌʌn'wə:dəbl] *adj* sözlə ifadə edilə bilməyən, dillə deyilə bilməyən; son dərəcə güclü/dərin/böyük/gözəl

**unworkable** [ˌʌn'wə:kəbl] *adj* işə yararsız, gərəksiz, faydasız; **an ~ plan** işə yararsız plan; **an ~ proposal** gərəksiz/faydasız təklif

**unworldly** [ˌʌn'wə:ldlɪ] *adj* **1.** qeyri-real, real /gerçək olmayan, xəyali; **an ~ outlook** qeyri-real/real olmayan nöqteyi-nəzər; **2.** dini, dünyəvi olmayan

**unworried** [ʌn'wʌrɪd] *adj* təlaşsız, həyəcansız, sakit; sakitləşmiş; **to appear ~ by criticism** tənqidi sakit qəbul etmək, tənqidə biganə qalmaq/biganəlik göstərmək

**unworthiness** [ˌʌn'wə:ðɪnɪs] *n* dəyərsizlik; nalayiqlik; heç bir şeyə dəyməmə

**unworthy** [ˌʌn'wə:ðɪ] *adj* **1.** yaramaz, şərəfsiz, nalayiq; alçaq; **an ~ person** yaramaz/alçaq adam; **2.** **(of)** layiq olmayan *(bir şeyə)*; **to be ~ of respect** hörmətə layiq olmamaq; *He's unworthy of respect O, hörmətə layiq deyil*; **3.** **(of)** müvafiq olmayan, uyğun gəlməyən, yaramayan *(bir şeyə)*; **4.** dəyərsiz, heç bir dəyəri olmayan, heç bir şeyə dəyməyən; **to fight for an ~ cause** yaramaz/heç bir şeyə yaramayan iş uğrunda mübarizə aparmaq

**unwound[1]** [ʌn'waund] **to unwind** *felinin pt, pp formaları*

**unwound[2]** [ˌʌn'waund] *adj* **1.** qurulmamış *(saat və s. haq.)*; **an ~ clock** qurulmamış saat *(divar və ya qol saatı)*; **2.** açılmış *(yumaq və s. haq.)*

**unwrap** [ʌn'ræp] *v* **1.** açmaq *(bağlamanı və s.)*; **to ~ a package** bağlamanı açmaq; **2.** açılmaq

**unwritten** [ˌʌn'rɪtn] *adj* **1.** yazılmamış; **~ law** yazılmamış qayda/qanun; **2.** şifahi, ağızdan-ağıza keçən; **~ songs of country people** şifahi xalq mahnıları

**unyielding** [ʌn'ji:ldɪŋ] *adj* səbatlı, dönməz, möhkəm; **~ in one's opinion** fikrində dönməz/səbatlı olmaq

**unyoke** [ʌn'jouk] *v* **1.** açmaq *(qoşqudan)*; boyunduruqdan açmaq; **2.** zülmdən/əsarətdən azad etmək

**unyoked** [ʌn'joukt] *adj* **1.** boyunduruğa qoşulmamış, boyunduruqlanmamış; **2.** zülmdən/əsarətdən azad edilmiş

**unzip** [ʌn'zɪp] *v* sep-düyməni açmaq

**up[1]** [ʌp] *n* böyük şəhərə/mərkəzə gedən avtobus/qatar;

◊ **~ and down** ötəri baxma/nəzərdən keçirmə; **to give a letter the ~ and down** məktuba ötəri nəzər salmaq, məktubu ötəri gözdən keçirmək /tələsik oxumaq; **to give** *smb.* **the ~ and down** bir kəsə ötəri nəzər salmaq/baxmaq; **~s and downs 1)** yoxuşlar və enişlər; **2)** qalxma və enmə, taleyin/bəxtin dönüklüyü *(həm də* **~s and downs of fortune**); **3)** çala-çuxurlar *(yolda)*; **4)** kəskin dəyişikliklər; **the ~s and downs of politics** siyasətdə kəskin dəyişikliklər; **5)** qiymətlərin qalxması və enməsi; **the ~s and downs of the market** bazar qiymətlərinin qalxması və enməsi

**up[2]** [ʌp] *adj* **1.** böyük şəhərə/mərkəzə/şimala gedən *(avtobus, qatar və s. haq.)*; **an ~ train etc.** paytaxta gedən qatar və s.; **the ~ platform** paytaxta gedən qatarın və s. dayandığı platforma; **the ~ line** *d.d.* paytaxta gedən dəmiryol xətti; **2.** böyüyən; artan; **the ~ trend** inkişaf/böyümə meyli

**up[3]** [ʌp] *v* (-pp-) **1.** qaldırmaq; **to ~ a box** qutunu qaldırmaq; *He upped the box and put it on the table O, qutunu qaldırıb stolun üstünə qoydu*; **2.** artırmaq, qaldırmaq, yüksəltmək *(qiyməti və s.)*; *They upped the prices Onlar qiymətləri qaldırdılar; I want him to up my fee Mən istəyirəm ki, o mənim qonorarımı qaldırsın/artırsın*; **3.** yerindən atılmaq/qalxmaq; *He always ups and says O həmişə qalxır və deyir; He upped and struck me O, yerindən dik atılıb məni vurdu*;

◊ **to ~ with one's hand** əlini qaldırmaq; **to ~ and down** qalxmaq və enmək

**up[4]** [ʌp] *adv* **1.** yuxarı; **to carry the box ~** qutunu yuxarı qaldırmaq; *The flames mounted up Alov yuxarı qalxdı; Lift your head up Başını/Başınızı yuxarı tut/tutun; The temperature has gone up Temperatur qalxıb; Hands up! Əllər yuxarı!* **2.** içərisinə; *The army marched up the country Ordu ölkənin içərisinə daxil oldu/yeridi*; **3.** yuxarıda; *What is he doing up there? O, yuxarıda nə edir? They live three storeys up Onlar üç mərtəbə yuxarıda yaşayırlar*; **to get ~** durmaq *(yataqdan)*; *He isn't up yet O hələ yataqdan durmayıb*; **to stand ~** qalxmaq *(ayağa)*; **4.** yaxınlaşma *(bir yerə)*; *The car drove up Maşın yaxınlaşdı; He came up and asked the way O yaxınlaşdı və yolu soruşdu*

**up[5]** [ʌp] *prep* **1.** *Hərəkətin aşağıdan yuxarı istiqamətini göstərir*: **to go ~ a ladder** nərdivanla qalxmaq; **to climb ~ a tree** ağaca çıxmaq/ dırmaşmaq; *The smoke goes up the chimney Tüstü buxarıdan yuxarı qalxır*; **2.** *Hərəkətin mərkəzə tərəf istiqamətini və ya hər hansı bir şeyə boyunca getdiyini bildirir: Azərbaycan türkcəsinə*

ilə, boyunca *sözləri ilə tərcümə edilir:* **to walk ~ the street** küçə ilə mərkəzə getmək, küçə boyunca getmək; **to sail ~ the river Thames** Temza çayı boyunca üzmək; 3. *Hərəkətin ölkənin içərilərinə yönəldiyini bildirir:* **to travel ~ (the) country** ölkənin içərilərinə səyahət etmək

**up-** [ʌp-] *pref Müxtəlif nitq hissələrinin düzəldilməsində iştirak edir: 1) İsimlərin əsasına birləşərək* **yuxarı, yuxarıya, yuxarıda** *mənaları ifadə edir:* **up**land dağlıq; **up**side **yuxarı** hissə/tərəf; 2) *Felə və feli ismə birləşərək* **böyümə**, *vəziyyətin dəyişməsi və s. mənaları bildirir:* **up**heaval irəliləyiş; **up**rise çıxma; **up**shot nəticə; aydınlaşma; 3) *Fellərə birləşərək hərəkətin tamamlanmasını, bitməsini bildirir:* to **up**root kökündən çıxartmaq, kökünü kəsmək; to **up**build tikib qurtarmaq/başa çatdırmaq

**up-and-coming** [ˌʌpən'kʌmɪŋ] *adj amer. d.d.* ümidverən, ümidverici; səy göstərən, səyli, inadkar; **an ~ young actor/scientist/painter** *etc.* ümidverici gənc aktyor/alim/rəssam və s.

**up-and-down** [ˌʌpən'daun] *adj* 1. yuxarı-aşağı /bir yerdən digər yerə hərəkət edən; 2. təpəlik, dağlıq; **~ country** təpəlik/dağlıq ölkə; 3. dik, sıldırım; **straight ~ bank** düz sıldırım sahil

**upas** ['ju:pəs] *n* 1. *bot.* ançar *(isti ölkələrdə bitən şirəsi zəhərli ağac)*; 2. ançar ağacının zəhəri

**upbeat** ['ʌpbi:t] *adj* nikbin, optimist; **to be in ~ mood** nikbin/optimist əhval-ruhiyyədə olmaq

**upbraid** [ʌp'breɪd] *v* 1. bəhanə axtarmaq, yersiz irad tutmaq, öcəşmək; 2. danlamaq, töhmətləndirmək, məzəmmət etmək, abırlamaq, tənə vurmaq, abrını almaq; *She upbraided me for my being late Gecikdiyimə görə o məni danladı*

**upbraiding** [ʌp'breɪdɪŋ] *adj* narazı, tənəli; **~ looks** narazı baxışlar; **~ words** tənəli sözlər

**upbringing** ['ʌpbrɪŋɪŋ] *n* tərbiyə; təlim; **religious ~** dini tərbiyə/təlim; **to have a strict ~** ciddi təlim-tərbiyə almaq/görmək

**upbuild** [ʌp'bɪld] *v (pt, pp* **upbuilt** [-bɪlt]*)* tikmək, tikib qurtarmaq/başa çatdırmaq

**upbuilt** [ʌp'bɪlt] **to upbuild** *felinin pt, pp formaları*

**upcoming** ['ʌpkʌmɪŋ] *adj* gələcək, gələcəkdə baş verəcək; **a review of ~ events** gələcək hadisələrin icmalı/xülasəsi

**up-country**[1] [ˌʌp'kʌntrɪ] *adj* daxili, ölkənin daxilində olan/yerləşən; **~ districts** ölkənin daxili rayonları

**up-country**[2] [ˌʌp'kʌntrɪ] *adv* ölkənin daxilində; **to travel ~** ölkənin daxilində səyahət etmək

**up-date**[1] [ˌʌp'deɪt] *n* müasirlik, yenilik

**up-date**[2] [ˌʌp'deɪt] *v* müasirləşdirmək; **to ~ a dictionary** lüğəti müasirləşdirmək; **to ~ production methods** istehsal üsullarını müasirləşdirmək; **to ~ computer system** kompyuter sistemini müasirləşdirmək

**up-dated** [ˌʌp'deɪtɪd] *adj* = **up-to-date**[1]

**up-end** [ʌp'end] *v* dik qoymaq; çevirmək; *He up-ended the basket and sat down on it O, səbəti çevirdi və onun üstündə oturdu*

**upfield** [ˌʌp'fi:ld] *adv id.* kənara, meydandan kənara; **to kick the ball ~** topu kənara/meydandan kənara vurmaq

**upfront** [ˌʌp'frʌnt] *adj* səmimi, açıq, aydın; **to be ~ about** *one's* **private life** şəxsi həyatı haqqında səmimi olmaq

**up-grade**[1] [ˌʌp'greɪd] *n* tərəqqi, yüksəliş, inkişaf; **on the ~** yüksəlişdə, inkişafda

**up-grade**[2] [ˌʌp'greɪd] *v* 1. daha yüksək əmək-haqqı verilən işə keçirmək; 2. keyfiyyəti yüksəltmək; 3. aşağı keyfiyyətli malı yüksək keyfiyyətli mal qiymətinə satmaq; 4. cinsi yaxşılaşdırmaq *(mal-qara haq.)*

**up-growth** [ˌʌp'grouθ] *n* inkişaf, artma; **a tremendous ~ of science** elmin nəhəng inkişafı

**up-heaval** [ʌp'hi:vəl] *n* 1. irəliləmə, irəliləyiş; dəyişiklik, tərəqqi, dönüş; **social ~** ictimai tərəqqi/ irəliləyiş; 2. çevriliş; **political ~** siyasi çevriliş

**up-hill**[1] [ˌʌp'hɪl] *n* yoxuş; **on the ~** yoxuşda; *On the uphill our pace dragged Yoxuşda biz ayaqlarımızı güclə sürüyürdük*

**up-hill**[2] [ˌʌp'hɪl] *adj* 1. yoxuş; **an ~ road** yoxuş yol; 2. çətin, ağır; **an ~ task** çətin tapşırıq; **~ fight** *hərb.* ağır döyüş

**up-hill**[3] [ˌʌp'hɪl] *adv* yoxuşa, dağa; **to go ~** dağa çıxmaq, yoxuşu qalxmaq

**up-hold** [ʌp'hould] *v (pt, pp* **upheld** [-'held]*)* 1. təsdiq etmək; **to ~ a decision** qərarı təsdiq etmək; 2. dəstəkləmək, təqdir etmək, tərəfdar olmaq; **to ~ a policy** siyasəti bəyənmək/təqdir etmək; *I can't uphold such conduct Mən belə davranışı/hərəkəti təqdir edə bilmərəm*; 3. saxlamaq; *Slender columns uphold the dome Zərif sütunlar günbəzi saxlayır*; 4. qaldırmaq; **to ~ *one's* hand** əlini/əl qaldırmaq

**up-holder** [ʌp'houldəʳ] *n* 1. tərəfdar, havadar; **~s of peace** sülh tərəfdarları; **~s of old traditions** köhnə adətlərin tərəfdarları; 2. dayaq, dirək

**up-holster** [ʌp'houlstəʳ] *v* üz çəkmək *(mebelə və s.)*; **to ~ a sofa** divana üz çəkmək

**up-holsterer** [ʌp'houlstərəʳ] *n* üzçəkən *(mebelə və s.)*

**up-holstery** [ʌp'houlstərɪ] *n* 1. üzçəkmə üçün material/parça; 2. üzçəkmə işi/sənəti

**upkeep** ['ʌpki:p] *n* 1. saxlama *(saz şəkildə)*; 2. təmir, qulluq, qulluq etmə, baxma; 3. saxlama/təmir etmə haqqı; *I can't afford the upkeep of a large house and garden Mənim böyük evi və bağı saxlamağa gücüm çatmır/saxlaya bilmirəm*



**up-land**[1] ['ʌplænd] *n (çox vaxt pl)* ölkənin dağlıq hissəsi; yayla; **the ~(s) of central Spain** mərkəzi İspaniyanın dağlıq yaylaları

**up-land**[2] ['ʌplænd] *adj* dağ, yayla; **an ~ region** dağ rayonu

**up-lift** [ʌp'lɪft] *v* 1. yuxarı qaldırmaq; 2. *məc.* açmaq, qaldırmaq *(kefi, əhval-ruhiyyəni); We were uplifted by his inspiring words Onun ruhlandırıcı sözləri bizim kefimizi açdı*; 3. açılmaq, qalxmaq *(kef və s.); His spirits were uplifted by the news Xəbər onun kefini açdı/qaldırdı*

**upon** [ə'pɔn] *prep* 1. = **on**[2]; 2. **to count, to depend, to look, to be, to stand, to stay** *və s. fellərdən və* **confident** *sifətindən sonra* **on** *sözünündən daha çox* **upon** *işlənir: You may depend upon it Sən/Siz buna əmin ola bilərsən/bilərsiniz*; **to look ~** hesab etmək; *I had always looked upon him as an authority on that subject Mən həmişə onu bu məsələdə etibarlı adam hesab etmişəm*; **to be ~ *smb.*** yaxınlaşmaq; *Summer holidays are upon us Yay tətili yaxınlaşır*; 3. *Cümlənin sonunda adətən* **on** *yox,* **upon** *işlənir; He is not to be relied upon Ona etibar /ümid etmək olmaz; He had nothing to live upon Onun yaşamağa heç nəyi/şeyi yox idi; What does he insist upon? O, nədə israr edir?*; 4. *İfadələrdə hərəkətin intensivliyini, təkrarən icra olunduğunu bildirir:* ...dalınca, ...ardınca; **to write letter ~ letter** məktubun ardınca məktub yazmaq; **to write petition ~ petition** ərizənin dalınca ərizə yazmaq; **loss ~ loss** itkinin dalınca/ardınca itki; 5. *Hərəkətin yuxarıya istiqamətini bildirir. Bu halda Azərbaycan türkcəsində yönlük hal şəkilçiləri* **-a, -ə** *və* **üstünə** *sözünə uyğun gəlir:* **to get ~ a roof** dama/damın **üstünə** çıxmaq; *He jumped upon the horse O, atın üstünə atıldı (yəni atı mindi)*; 6. *Aşağıdakı birləşmələrdə* **on** *deyil, əsasən* **upon** *işlədilir:* **to come ~** 1) rast gəlmək, təsadüf etmək, rastlaşmaq, qarşısına çıxmaq; *I came upon him in the street Mən küçədə onunla qarşılaşdım/rastlaşdım; I came upon the right answer by accident Mən təsadüfən doğru cavab tapdım*; 2) bürümək, çulğamaq; *Doubt came upon me Məni şübhə bürüdü/çulğadı; Once upon a time Bir zamanlar, Biri vardı, biri yoxdu; Upon my word (of honour)! Vicdan/Vicdanım haqqı!*

**upper** ['ʌpəʳ] *adj* üst, yuxarı; **~ lip/jaw** üst dodaq/çənə; **~ rooms/storeys/windows** yuxarı otaqlar/mərtəbələr/pəncərələr; **the ~ levels of society** cəmiyyətin yuxarı təbəqələri; ◊ **~ crust** cəmiyyətin kübar hissəsi; **to get/to have the ~ hand** qalib gəlmək, üstün olmaq, üstünlük əldə etmək

**Upper House** [ˌʌpə'haus] *n* yuxarı palata *(İngiltərədə lordlar palatası, ABŞ-da senat)*

**uppermost**[1] ['ʌpəmoust] *adj* 1. ən yuxarı/yüksək; **the ~ branches of a tree** ağacın ən yuxarı budaqları; **the ~ floor** ən yuxarı mərtəbə/qat; 2. əsas, başlıca; **the ~ subject of conversation** söhbətin əsas/başlıca mövzusu; **to be ~** üstün /hakim olmaq, ağalıq/ hökmranlıq etmək

**uppermost**[2] ['ʌpəmoust] *adv* 1. yuxarı, yuxarıya, yuxarıda; *The car lay with its wheels uppermost Maşın təkərləri yuxarı dayanmışdı; Put the box down with this side uppermost Qutunun bu tərəfini yuxarı qoy/qoyun*; 2. hər şeydən əvvəl /öncə; **to say what ~** əvvəlcə ağlına nə gəldi demək; *His friend's fate was uppermost in his thoughts O hər şeydən öncə dostunun taleyini fikirləşdi*

**uppish** ['ʌpɪʃ] *adj* 1. lovğa, təkəbbürlü, iddialı, heç kəsi bəyənməyən, başqalarına xor baxan; 2. həyasız, sırtıq, utanmaz; **an ~ woman** həyasız/utanmaz qadın; **an ~ child** sırtıq uşaq

**uppishly** ['ʌpɪʃlɪ] *adv* 1. lovğa-lovğa, lovğalıqla, təkəbbürlə, iddialı-iddialı; 2. həyasızcasına, utanmazcasına, utanmaz-utanmaz

**uppishness** ['ʌpɪʃnɪs] *n* 1. lovğalıq, iddialılıq, təkəbbürlülük; 2. həyasızlıq, utanmazlıq, sırtıqlıq

**upraise** ['ʌpreɪz] *v (adət. pp formasında işlədilir)* qaldırmaq; **with hands ~d to heaven** əllərini göyə qaldırmış halda; *They saluted him with upraised hands Onlar əllərini qaldıraraq onu salamladılar*

**upright**[1] ['ʌpraɪt] *n* dirək, dayaq, tir; sütun; dayaq dirəkləri

**upright**[2] ['ʌpraɪt] *adj* 1. vertikal, şaquli; 2. düz; **an ~ tree** düz ağac; 3. dik, sıldırım *(qaya və s. haq.)*; 4. ədalətli, qərəzsiz; **an ~ judge** ədalətli /qərəzsiz hakim

**upright**[3] ['ʌpraɪt] *v* düz/şaquli qoymaq; düz/dik vəziyyətdə qaldırmaq

**upright**[4] ['ʌpraɪt] *adv* düz/şaquli; **to stand ~** düz dayanmaq/durmaq

**uprightly** ['ʌpraɪtlɪ] *adv* ədalətlə, qərəzsiz, düz, namusla, vicdanla, doğru

**uprightness** ['ʌpraɪtnɪs] *n* 1. ədalətlilik, düzlük, vicdanlılıq; 2. şaqulilik, diklik, dik/vertikal vəziyyət

**uprising** [ʌp'raɪzɪŋ] *n* 1. çıxma, doğma *(günəş haq.)*; 2. qalxma *(yataqdan)*; 3. qiyam, üsyan; **an armed ~** silahlı üsyan/qiyam; 4. yoxuş; 5. zühur etmə, meydana çıxma

**uproar** ['ʌprɔ:ʳ] *n (Ancaq təkdə işlənir)* 1. səs-küy, qalmaqal; qarmaqarışıqlıq; qarışıqlıq, vəlvələ, çaxnaşma; *The meeting ended in (an) uproar İclas qalmaqalla qurtardı; The town was in an uproar Şəhər çaxnaşma içərisində idi*; 2. qəhqəhə səsi; gurultu

**uproarious** [ʌp'rɔ:rɪəs] *adj* səsli, səsli-küylü, gurultulu, qızğın, qalmaqallı; qudurğan, şiddətli; **~ meeting** səsli-küylü/qalmaqallı iclas; **~ applause** gurultulu alqış; **an ~ debate** qızğın/qalmaqallı müzakirə

**uproot** [ˌʌp'ru:t] *v* 1. kökündən çıxartmaq *(ağacı və s.)*; *The floods uprooted the trees Daşqınlar ağacları kökündən çıxartdı*; 2. yaşayış yerindən güclə qovmaq; **to ~ *smb.* from his home** bir kəsi evindən qovmaq; 3. kökünü kəsmək; **to ~ customs** adətlərin kökünü kəsmək

**upset**[1] ['ʌpset] *n* 1. yıxılma; *That's the second upset I've had this week Mən bununla bu həftə ikinci dəfə yıxılıram*; 2. qarışıqlıq, səliqəsizlik; şuluqluq, iğtişaş; 3. puça /boşa çıxma, iflas *(plan və s. haq.)*; 4. narazılıq; küsülülük, dalaşma, küsüşmə; **a bit of an ~ with his father** atası ilə bir balaca küsüşmə; 5. nasazlıq, kefsizlik; **a stomach ~** mədə pozğunluğu; 6. gözlənilməz məğlubiyyət *(yarışda, seçkidə və s.)*

**upset**[2] [ˌʌp'set] *adj* 1. kefsiz, narahat, məyus; narahat edilmiş, məyus olmuş; *I'm very upset about having to miss the party Qonaqlığa gedə bilmədiyimdən çox məyusam/məyus olmuşam*; 2. pozulmuş *(mədə haq.)*; **an ~ stomach** pozulmuş mədə

**upset**[3] [ʌp'set] *v* (-tt-; *pt, pp* **upset**) 1. çevirmək; **to ~ a boat** qayığı çevirmək; 2. çevrilmək; *If you don't sit still, the boat will upset Sakit otur-masan, qayıq çevriləcək*; 3. mədəsini pozmaq; *Cheese often upsets her stomach Pendir tez-tez onun mədəsini pozur*; 4. pərt etmək, ovqatını təlx etmək, kefini pozmaq, qanını qaraltmaq; *The bad news completely upset him Pis xəbər onun kefini tamam korladı; Don't upset yourself – no harm has been done Kefini /Kefinizi pozma/pozmayın – heç bir ziyan dəyməyib*; 5. pozmaq *(cədvəli, planı və s.)*; *Bad weather has upset the train timetable Pis hava qatarın cədvəlini pozub*; **to ~ *smb.'s* plans** bir kəsin planlarını pozmaq; 6. gözlənilmədən məğlub etmək *(seçkidə, yarışda və s.)*; **to ~ the government** hökuməti gözlənilmədən məğlub etmək; 7. əlindən salmaq; **to ~ *one's* cup** fincanı əlindən salmaq

**upshot** ['ʌpʃɔt] *n* (**the ~**) nəticə, yekun; **in the ~** nəticədə, nəhayətdə; **to come to the ~** nəticəyə gəlmək

**upside-down**[1] [ˌʌpsaɪd'daun] *adj* tərsinə, tərsinə çevrilmiş; mənasız, məntiqsiz; **an ~ plate** tərsinə çevrilmiş boşqab; **~ ideas** mənasız/məntiqsiz fikirlər; *This picture is upside-down Bu şəkil tərsinədir*

**upside-down**[2] [ˌʌpsaɪd'daun] *adv* tərsinə, ayaqbaş, baş-ayaq, alt-üst; **to read a newspaper ~** qəzeti tərsinə oxumaq; *Why are you reading the newspaper upside-down Sən/Siz nə üçün qəzeti tərsinə/baş-ayaq oxuyursan?/oxuyursunuz?; Burglars had turned the house upside-down Oğrular evi alt-üst etmişdilər; She turned the room upside-down, but couldn't find the ring O, otağı alt-üst etdi, lakin üzüyü tapa bilmədi*

**upstage** [ˌʌp'steɪdʒ] *adj* 1. səhnəarxası; **an ~ door** səhnəarxası qapı; 2. iddialı, lovğa, təkəbbürlü, başqalarına xor baxan, heç kimi bəyənməyən

**upstairs**[1] [ˌʌp'steəz] *n* yuxarı mərtəbə/qat, yuxarı mərtəbədə/qatda yaşayan adam

**upstairs**[2] [ˌʌp'steəz] *adj* yuxarı, yuxarıdakı, yuxarıda olan; **an ~ room/window** yuxarıdakı otaq /pəncərə

**upstairs**[3] [ˌʌp'steəz] *adv* 1. yuxarıda, yuxarı mərtəbədə/qatda, üst qatda/mərtəbədə; **to live ~** yuxarı mərtəbədə/qatda yaşamaq; *They live upstairs Onlar yuxarı mərtəbədə/qatda yaşayırlar*; 2. yuxarı; başıyuxarı, üzüyuxarı; **to go/to walk ~** yuxarı qalxmaq/getmək *(pilləkənlə)*

**upstanding** [ˌʌp'stændɪŋ] *adj* 1. dik, dikduran; **~ collar** dikduran yaxalıq; 2. yaxşı qədd-qamətli/boylu-buxunlu; 3. düz, təmiz, vicdanlı, namuslu, səmimi; 4. möhkəm, qəti müəyyən edilmiş; **~ wage** qəti müəyyən edilmiş əməkhaqqı

**upstart**[1] ['ʌpsta:t] *n* layiq olmadığı mövqeyi tutan adam, bambılı, birdən varlanan adam

**upstart**[2] ['ʌpsta:t] *adj* 1. meydana yeni çıxmış, dəbdə/modda olan; modaya düşmüş; 2. bambılıya xas olan; lovğa, özünə güvənən, özü ilə qürrələnən; 3. gözlənilmədən məşhurluq qazanan *(adam, ailə və s. haq.)*

**upstart**[3] [ʌp'sta:t] *v* 1. sıçrayıb çıxmaq; sıçramaq, atılmaq, tullanmaq; 2. zahir/peyda olmaq, görünmək; 3. hürkütmək, hürküdüb qaçırtmaq

**upsurge**[1] ['ʌpsə:dʒ] *n* yüksəlmə, yüksəliş, inkişaf; **revolutionary ~** inqilabi yüksəliş; **an ~ in sale** ticarətdə yüksəliş/inkişaf

**upsurge**[2] ['ʌpsə:dʒ] *v* qalxmaq, yüksəlmək, ucalmaq; artmaq, güclənmək

**upswing** ['ʌpswɪŋ] *n* gözlənilməz yüksəliş/inkişaf, sıçrayış; **to be on the ~** tez/sürətlə inkişaf etmək; *This event led to an upswing in the party's popularity Bu hadisə partiyanın şöhrətini/məşhurluğunu artırdı*

**uptake** ['ʌpteɪk] *n (Ancaq təkdə işlənir)* 1. udma; **the body's oxygen ~** orqanizmin oksigen udması; 2. *d.d.* anlama, qavrama; **to be slow /quick in (on) the ~** gec/tez qavramaq

**up-to-date**[1] [ˌʌptə'deɪt] *adj* 1. müasir, çağdaş, dəbdə olan; **~ clothes** dəbdə olan paltarlar; **~ books** müasir/çağdaş kitablar; **~ methods** müasir metodlar; **an ~ dictionary** müasir lüğət; 2. son hadisələrdən/ məsələlərdən xəbərdar olan

**up-to-date**[2] [ˌʌptə'deɪt] *adv* hazırkı vaxta qədər, indiyə qədər, hələ də

**uptown**[1] [ˌʌp'taun] *adj* şəhərin yuxarı hissəsində yaşayan /olan

**uptown**[2] [ˌʌp'taun] *adv* şəhərin yuxarı hissəsinə/ hissəsində

**upturn**[1] [ʌp'tə:n] *n* 1. yüksəlmə, yüksəliş, yaxşılaşma; **an ~ in business** biznesdə yüksəlmə/yaxşılaşma; 2. qalxma, yüksəlmə *(qiymət və s. haq.)*; 3. *d.d.* qarışıqlıq, xaos; qarma-qarışıqlıq, hərc-mərclik; 4. tikiş yeri *(paltarda)*

**upturn**[2] [ʌp'tə:n] *v* 1. yuxarı qaldırmaq *(gözü və s.)*; 2. qalxmaq *(göz və s.)*

**upturned** [ˌʌp'tə:nd] *adj* 1. çevrilmiş, döndərilmiş; 2. qazılmış, qazılıb çıxarılmış/tapılmış; 3. dik, yuxarı qalxmış; **an ~ nose** dik burun

**upward**[1] ['ʌpwəd] *adj* yuxarı yönəlmiş/istiqamətlənmiş; **an ~ glance** yuxarı istiqamətlənmiş/yönəlmiş baxış; *Prices show an upward tendency Qiymətlər qalxır/yüksəlir*

**upward**[2] ['ʌpwəd] *adv* = **upwards**

**upwards** ['ʌpwədz] *adv* 1. yuxarı, üzüyuxarı, başıyuxarı; **to look ~** yuxarı baxmaq; **to move ~** yuxarı/üzüyuxarı /başıyuxarı hərəkət etmək; **to follow the river ~** çay boyunca yuxarı getmək; 2. daha böyük/artıq; **children of six years old and ~** altıyaşlı və daha böyük uşaqlar;

◊ **~ of** 1) çox, artıq; *They found upwards of forty specimens Onlar qırxdan çox/artıq nümunə tapdılar*; 2) təxminən; **~ of a thousand words** təxminən min söz

**up-wind** [ˌʌp'wɪnd] *adv* küləyə qarşı; **to go ~** küləyə qarşı getmək

**uraemia** [juə'ri:mjə] *n tib.* uremiya *(böyrək xəstəliyi nəticəsində bədənin öz-özünə zəhərlənməsi)*

**Ural-Altaic** ['juərəlæl'teɪk] *n* Ural-Altay dil qrupu

**uranium** [juə'reɪnɪəm] *n kim.* uran

**Uranus** ['juərənɪs] *n astr.* Uran *(planet)*

**urban** ['ə:bən] *adj* şəhər; **~ population** şəhər əhalisi; **~ district** şəhər rayonu; **~ life** şəhər həyatı

**urbane** [ə:'beɪn] *adj* ədəbli, mərifətli, nəzakətli, gülərüzlü, iltifatlı, lütfkar; **an ~ man** ədəbli/ mərifətli /nəzakətli/ iltifatlı adam

**urbanely** [ə:'beɪnlɪ] *adv* ədəblə, mərifətlə, nəzakətlə, lütfkarlıqla, iltifatla

**urbanist** ['ə:bənɪst] *n* şəhərsalma mütəxəssisi

**urbanity** [ə:'bænɪtɪ] *n* 1. ədəblilik, mehribanlıq, nəzakətlilik, lütfkarlıq, gülərüzlülük, iltifatlılıq; 2. şəhər həyatı

**urbanization, -isation** [ˌə:bənaɪ'zeɪʃn] *n* şəhərə çevirmə, şəhərləşdirmə *(kənd rayonlarını)*

**urbanize, -ise** ['ə:bənaɪz] *v (adət. məchulda işlənir)* kənd rayonunu şəhərə çevirmək

**urchin** ['ə:tʃɪn] *n* küçə uşağı *(oğlan)*

**Urdu** ['ə:du] *n* Urdu dili *(Pakistanda işlədilən dövlət dili)*

**urea** ['juərɪə] *n kim.* sidik cövhəri

**urethra** [juə'ri:θrə] *n (pl* **-ae**, *və ya* **-s** [-z]) *anat.* sidik kanalı/borusu

**urethrae** [juə'ri:θri:] *n* **urethra** *isminin cəm forması*

**urethritis** [ˌjuərɪ'θraɪtɪs] *n (pl* **-ides**) *tib.* uretrit *(sidik borusunun iltihabı)*

**urge**[1] [ə:dʒ] *n (adət. sing)* arzu, istək, məqsəd, meyl, səbəb, vadaredici səbəb; zorlama; **sexual ~** cinsi həvəs/istək; **~ to write** yazmaq arzusu/istəyi

**urge**[2] [ə:dʒ] *v (adət.* **on**) 1. məcbur/vadar etmək; qovmaq, sürmək *(mal-qaranı)*, çaparaq sürmək *(atı)*; *With whip and spur the rider urged his horse onward Atlı qamçı və mahmızla atını çapmağa məcbur etdi*; 2. oyatmaq, təhrik/məcbur etmək; *Three general purposes have urged me to the task Üç başlıca məqsəd məni bu məsələ ilə məşğul olmağa vadar etdi*; 3. inandırmaq, təkid etmək, israr etmək, inad göstərmək, inad göstərməklə məqsədinə çatmaq; *We urged him to consult a doctor Biz təkid etdik ki, o, həkimə müraciət etsin*

**urgency** ['ə:dʒənsɪ] *n* 1. təcililik, tələsiklik; təxirə salınmazlıq, yubanmazlıq; **a matter of great ~** çox təcili məsələ; **in case of ~** çarəsiz/əlacsız halda; 2. inad, israr, səbat, inadkarlıq; **the ~ of a claimant** iddiaçının inadı/inadkarlığı

**urgent** ['ə:dʒənt] *adj* 1. təcili, təxirəsalınmaz; tələsik; **~ order** təcili sifariş; **~ business** təxirəsalınmaz iş; 2. mühüm, vacib; **~ question** mühüm /vacib məsələ; 3. inadlı, inadkar; zəhlətökən, qarayaxa, bezikdirən, usandıran; əlçəkməz; **~ creditor** inadkar/kreditor *(kredit verən)*

**urgently** ['ə:dʒəntlɪ] *adv* təcili, təcili olaraq, tələsik, yubanmadan, təxirə salmadan, dərhal; *He said he wanted to see me urgently O dedi ki, məni təcili olaraq görmək istəyir*

**urinal** ['juərɪnl] *n* pissuar *(ayaqyolunda divara bərkidilmiş sidik çanağı)*

**urinary** ['juərɪnərɪ] *adj* sidik; **~ bladder** sidik kisəsi; **~ disease** sidik yolu xəstəliyi

**urinate** ['juərɪneɪt] *v* işəmək, siymək

**urination** [ˌjuərɪ'neɪʃn] *n* işəmə, siymə

**urine** ['juərɪn] *n* sidik

**urn** [ə:n] *n* 1. urna *(yandırılmış meyitin külünü saxlamaq üçün vazşəkilli qutu)*; 2. urna *(seçki bülletenləri salmaq üçün qutu)*; 3. elektrik samovarı/ qəhvədanı

**us** [ʌs] *(tam forma*; [əs, s] *(qısa formaları) pers pron* 1. **we** *şəxs əvəzliyinin obyekt halı*: **bizi, bizə**; *They met us at the station Onlar bizi stansiyada qarşıladılar; He helped* **us** *O* **bizə** *kömək etdi*; 2. *Bəzən Azərbaycan türkcəsinə qayıdış əvəzliyi ilə tərcümə edilir; We took the documents with* **us** *Biz sənədləri* **özümüzlə** *götürdük*

**usable** ['ju:zəbl] *adj* 1. işlənə bilən; *These tyres are worn, but still usable Bu şinlər yeyilib/sürtülüb, lakin hələ işlənə bilər*; 2. rahat, qolay; əlverişli, münasib

**usage** ['ju:zɪdʒ] *n* 1. işlənmə; **~ of words** sözlərin işlənməsi; **modern English ~** müasir ingilis dilinin işlənməsi; *It's not a word in common usage Bu çox işlənən söz deyil*; 2. adət, ənənə,

**ancient** ~ qədim ənənə/adət; *Meals based on rice are not in common usage in England Düyüdən hazırlanmış yeməklər İngiltərədə adət deyil*; 3. rəftar; **rough** ~ kobud/qaba rəftar; **good** ~ yaxşı/səmimi rəftar

**use[1]** [ju:s] *n* **1**. *(Ancaq təkdə işlənir)* istifadə, istifadə etmə/olunma; tətbiq etmə; **the ~ of electricity for heating** elektrikdən istilik üçün istifadə etmə; **the ~ of force** gücdən istifadə etmə, güc tətbiq etmə; **to keep** ***smth.*** **for** ***one's*** **own ~** bir şeyi öz şəxsi istifadəsi üçün saxlamaq; *This car park is for the use of customers only Bu maşın parkı ancaq müştərilərin istifadəsi üçündür*; 2. məqsəd; **a tool with different ~s** müxtəlif məqsədlər üçün işlədilən alət; 3. məna, əhəmiyyət, xeyir, fayda, mənfəət; **to be of ~** əhəmiyyətli/faydalı olmaq; **to be no ~** əhəmiyyətsiz/faydasız/xeyirsiz olmaq; *It's no use talking Danışmağın mənası/faydası/əhəmiyyəti yoxdur; What's the use of talking about it? Bu barədə danışmağın mənası/faydası/əhəmiyyəti/xeyri nədir? Is there any use in discussing the matter further? Bu məsələnin sonrakı müzakirəsindən fayda varmı?*; 4. adət; *It was his use to walk ten miles every day Hər gün on mil gəzmək onun adəti idi*; **according to an ancient ~** qədim adətə görə; *Use is second nature Adət ikinci xasiyyətdir;*

◊ **to have no ~ for** 1) ehtiyacı olmamaq *(bir şeyə)*; 2) nifrət etmək, xor baxmaq, alçaq nəzərlə baxmaq, zəhləsi getmək

**use[2]** [ju:z] *v (pt, pp* **used** [ju:zd]) **1**. istifadə etmək, işlətmək; **to ~ a dictionary/a tool** lüğətdən /alətdən istifadə etmək; **to ~ a right/a chance** hüquqdan/imkandan istifadə etmək; *May I use your phone? Sənin/Sizin telefonundan/telefonunuzdan istifadə etmək olarmı? He never uses a dictionary while reading O oxuyarkən heç vaxt lüğətdən istifadə etmir*; **to ~** ***one's*** **eyes** baxmaq; **to ~** ***one's*** **legs** yerimək; **to ~** ***one's*** **brains/wits** fikirləşmək, düşünmək; 2. rəftar etmək *(bir kəslə)*; **to ~** ***smb.*** **well/ill** bir kəslə yaxşı/pis rəftar etmək; **to ~** ***smb.*** **like a dog** bir kəslə it kimi rəftar etmək; 3. alışdırmaq, öyrətmək, öyrəşdirmək; **to ~ oneself to speak aloud** özünü ucadan danışmağa alışdırmaq;

◊ **to ~ up** 1) istifadə edib qurtarmaq/tükətmək; *Our stock of matches is used up Bizim bütün spiçka/kibrit ehtiyatımız istifadə olunub qurtarıb*; **to ~ up** ***one's*** **energy in fruitless efforts** enerjisini faydasız/səmərəsiz cəhdlərə sərf etmək; 2) yormaq, əldən salmaq; *I'm used up Mən lap əldən düşmüşəm, Mənim tabım qalmayıb*

**used** [ju:zd] *adj* I işlənmiş, köhnə; **~ clothes** köhnə paltar; **a ~ car** işlənmiş/köhnə maşın

**used** [ju:st] *adj* II öyrəşmiş, alışmış, adət etmiş; **to get/to become ~ to** ***smth.*** bir şeyə alışmaq/öyrəşmək; **to be ~ to hard work** ağır işə öyrəşmək/ adət etmək; *The food here seemed strange at first, but I soon became/got used to it Burada yeməklər əvvəlcə mənə qəribə göründü, lakin tezliklə mən onlara alışdım/öyrəşdim*

**useful** ['ju:sfl] *adj* faydalı, yararlı, xeyirli; **a ~ dictionary/book/advice** faydalı lüğət/kitab/məsləhət; *This book was very useful to me Bu kitab mənim üçün çox faydalıdır*

**usefully** ['ju:sfəlı] *adv* faydalı, faydalı tərzdə/olaraq, xeyirli, xeyirli tərzdə

**usefulness** ['ju:səfəlnıs] *n* faydalılıq, xeyirlilik; **the ~ of research** tədqiqatın faydalılığı/xeyri

**useless** ['ju:sləs] *adj* **1**. faydasız, xeyirsiz, nəticəsiz, səmərəsiz, əbəs, bihudə; **~ attempts** faydasız/ mənasız/səmərəsiz cəhdlər; *All our attempts were useless Bizim bütün cəhdlərimiz faydasız/səmərəsiz oldu; It's useless to argue/arguing with them Onlarla mübahisə etmək faydasızdır/xeyirsizdir*; **2**. yararsız, heç nəyə dəyməyən; faydası/xeyri olmayan; *A car is useless without petrol Benzinsiz maşının faydası yoxdur*; 3. *d.d.* pis/yararsız vəziyyətdə; naxoş, kefsiz; *I'm feeling useless Mən heç bir şeyə yaramıram*

**uselessness** ['ju:sləsnıs] *n* faydasızlıq, səmərəsizlik, xeyirsizlik; fayda/səmərə/xeyir verməmə

**uselessly** ['ju:sləslı] *adv* faydasız, səmərəsiz, faydasız/səmərəsiz olaraq, bihudə/boş/əbəs yerə; **to work ~** faydasız/səmərəsiz yerə işləmək

**user** ['ju:zə<sup></sup>] *n* **1**. istifadə edən; **a telephone ~** telefondan istifadə edən; 2. istehlakçı, müştəri

**usher[1]** ['ʌʃə<sup></sup>] *n* **1**. qapıçı, dalandar; **2**. biletyoxlayan, biletəbaxan; 3. *amer.* sağdış, soldış

**usher[2]** ['ʌʃə<sup></sup>] *v* **1**. ötürmək, müşayiət etmək; yer göstərmək; **to ~** ***smb.*** **into the room** bir kəsi otağa ötürmək; *The buttler ushered me into the drawing-room Eşikağası məni qonaq otağına ötürdü*; 2. *amer.* sağdış/soldış olmaq

**usheress** ['ʌʃərıs] *n* biletyoxlayan/biletəbaxan qadın

**usual** ['ju:ʒuəl] *adj* adi, həmişəki; **the ~ terms** adi şərtlər; *We all met at the usual time Biz hamımız həmişəki vaxtda görüşdük; He came later than usual O, həmişəkindən gec gəldi*; **as ~** həmişə olduğu kimi; *He's drunk as usual O həmişə olduğu kimi sərxoşdur/keflidir*

**usually** ['ju:ʒuəlı] *adv* adətən, bir qayda olaraq, adəti üzrə; *He usually comes home late O adətən/bir qayda olaraq evə gec gəlir; I usually work in the mornings Mən adətən/bir qayda olaraq/adəti üzrə səhərlər işləyirəm; What do you usually do on Sundays? Sən/Siz bazar günləri adətən nə edirsən?/edirsiniz?*

**usurer** ['juʒərə<sup></sup>] *n* sələmçi, müamiləçi *(faizlə borc pul verən adam)*



**usurp** [ju:'zə:p] *v* **1**. qəsb etmək, qeyri-qanuni olaraq ələ keçirmək *(hakimiyyəti və s.)*; **2**. **(on)** qəsd etmək, əl uzatmaq, əl atmaq, toxunmaq; **to ~ on** ***smb.'s*** **rights** bir kəsin hüquqlarına qəsd etmək/toxunmaq/əl uzatmaq

**usurpation** [.ju:zə:'peıʃn] *n* qəsb etmə, qanunsuz olaraq ələ keçirmə *(hakimiyyəti və s.)*

**usurper** [ju:'zə:pə<sup></sup>] *n* qəsbkar, qəsb edən

**usury** ['ju:ʒərı] *n* **1**. sələmçilik, müamiləçilik; **to practise ~** sələmçiliklə/müamiləçiliklə məşğul olmaq; **2**. sələmçilik faizi

**utensil** [ju:'tensl] *n* **1**. qab-qacaq; qab; **kitchen ~s** mətbəx qab-qacağı; **2**. ləvazimat; **writing ~s** yazı ləvazimatları; **3**. alət; **farming ~s** kənd təsərrüfatı alətləri

**uteri** ['ju:təraı] *n* **uterus** *isminin cəm forması*

**uterine** ['ju:təraın] *adj* **1**. anadan bir, atadan ayrı; anabir, ata ayrı *(övlad haq.)*; **~ brothers /sisters** anadan bir, atadan ayrı qardaşlar/bacılar; **2**. *anat.* uşaqlıq, balalıq; uşaqlığa/balalığa aid; **~ fibroma** *tib.* fibroma *(birləşdirici toxumalardan əmələ gələn zərərsiz şiş)*

**uterus** ['ju:tərəs] *n (pl* **uteruses)** *anat.* uşaqlıq, balalıq

**utilitarian[1]** [.ju:tılı'teərıən] *n* **1**. mənfəətpərəst, hər şeydən ancaq fayda və mənfəət çıxarmağa çalışan adam; **2**. utilitarist *(utilitarizm tərəfdarı)*

**utilitarian[2]** [.ju:tılı'teərıən] *adj* ancaq fayda və mənfəət güdən/nəzərdə tutan; **from the merely ~ point of view** ancaq fayda və mənfəət baxımından/nöqteyi-nəzərindən

**utilitarianism** [.ju:tılı'teərıənızm] *n* utilitarizm; mənfəətpərəstlik, hər şeydən fayda və mənfəət götürməyə çalışma

**utility[1]** [ju:'tılıtı] *n* **1**. faydalılıq, xeyirlilik, sərfəlilik, yararlılıq; **of no ~** xeyirsiz, faydasız, yararsız; **2**. faydalı/xeyirli/sərfəli şey; **3**. *pl* ictimai müəssisələr; kommunal tikililər/binalar/tikintilər; kommunal xidmətlər; *The rent of the house includes all utilities Ev kirayəsinə bütün kommunal xidmətlərin qiyməti daxildir*

**utility[2]** [ju:'tılıtı] *adj* **1**. əməli, tətbiqi; **~ art** tətbiqi incəsənət; **2**. əlverişli, sərfəli; **~ furniture** əlverişli mebel; **~ clothes** əlverişli paltar *(gündəlik geyilən)*; **3**. universal; çox işə yarayan; **~ bag** bazar sumkası; **~ knife** bir neçə tiyəsi olan bıçaq; **4**. ikinci dərəcəli, epizodik *(filmin, romanın personajı və s. haq.)*; **5**. köməkçi; **~ actor** köməkçi aktyor; **~ man** 1) *id.* ehtiyat oyunçu; 2) *dən.* gəmi aşpazının köməkçisi; **6**. iqtisadi baxımdan/cəhətdən faydalı, gəlirli, qazanclı, səmərəli; **~ poultry** gəlirli/qazanclı quşçuluq; **7**. ucuz, aşağı keyfiyyətli; **~ beef** ucuz/aşağı keyfiyyətli mal əti

**utilization, -isation** [.ju:'təlaı'zeıʃn] *n* istifadə etmə, işlətmə

**utilize, -ise** ['ju:təlaız] *v* istifadə etmək; **to ~ all available resources** bütün mümkün mənbələrdən istifadə etmək; **to ~ solar power as a source of energy** günəşin gücündən enerji mənbəyi kimi istifadə etmək

**utmost** ['ʌtmoust] *adj* **1**. ən uzaq/ucqar; **the ~ ends of the earth** yer kürəsinin ən uzaq/ucqar qurtaracağı; **the ~ point of the earth** yer kürəsinin ən ucqar nöqtəsi; **2**. son, axır, sonuncu, axırıncı; **the ~ limit** son limit/hədd; **3**. çox böyük, son dərəcə; **with the ~ care** çox böyük qayğı ilə; **to irritate** ***smb.*** **to the ~** bir kəsi son dərəcə qıcıqlandırmaq;

◊ **to do/to try** ***one's*** **~ to do** ***smth.*** bir şey etmək üçün əlindən gələni etmək; *I did my utmost to stop them Mən onları dayandırmaq üçün əlimdən gələni etdim*

**Utopia** [ju:'toupıə] *n* utopiya, xəyal, xam xəyal

**Utopian[1]** [ju:'toupıən] *n* utopist, xəyalpərəst, xülyaçı

**Utopian[2]** [ju:'toupıən] *adj* utopik, xəyali; **~ socialism** utopik sosializm

**Utopianism** [ju:'toupıənızm] *n* utopizm, xəyalpərəstlik, xülyaçılıq

**utter[1]** ['ʌtə<sup></sup>] *adj* **1**. tam, tamam, absolyut, bütün, büsbütün; **~ nonsense** tam/büsbütün mənasızlıq; **~ ruin** tam/büsbütün iflas; **~ darkness** tam /tamam qaranlıq; *He's an utter stranger to me O mənə tamam yaddır, Mən onu əsla tanımıram*; **2**. qəti, danışıqsız, şərtsiz; **~ refusal** qəti imtina etmə/boyun qaçırma; **3**. qatı, açıq, aşkar; ifrat; **~ scoundrel** qatı/ifrat yaramaz/əclaf

**utter[2]** ['ʌtə<sup></sup>] *v* **1**. çıxartmaq *(səs)*, tələffüz etmək; **to ~ a sigh** əsnəmək; **to ~ a groan** zarımaq, inildəmək; *Not a sound was uttered Bir səs belə çıxmadı/ eşidilmədi*; **2**. ifadə/şərh/bəyan etmək, başa salmaq, söyləmək: **to ~** ***one's*** **thoughts** öz fikrini ifadə etmək/bəyan etmək/söyləmək; **to ~** ***one's*** **feelings** öz hisslərini ifadə/bəyan etmək; **to ~ a declaration** bəyanat vermək; **3**. tədavülə buraxmaq *(xüs. saxta pul və s.)*

**utterance** ['ʌtərəns] *n* **1**. tələffüz etmə, sözlə demə, ifadə etmə; **to give ~ to** sözlə ifadə etmək /demək; **2**. tələffüz, diksiya, danışıq tərzi; **clear ~** aydın/səlis tələffüz/diksiya; **defective ~** qüsurlu tələffüz/diksiya; **3**. danışıq/danışmaq qabiliyyəti; *He has no gift of utterance Onun əsla/qətiyyən danışıq qabiliyyəti yoxdur*; **4**. demə, söyləmə; **public ~** açıq demə/ söyləmə; **5**. tədavülə buraxma *(saxta pul və s.)*; **the ~ of false coins** tədavülə saxta sikkə/pul buraxma

**utterless** ['ʌtəlıs] *adj* **1**. deyilməyən, söylənilməyən, bəyan edilməyən; **2**. təsvir oluna bilməyən, sözlə deyilə/dillə ifadə edilə bilməyən; **~ dishonour** dillə deyilə bilməyən biabırçılıq /rüsvayçılıq/üzüqaralıq

**utterly** ['ʌtəlı] *adv* tam, tamam, tamamilə; **to be**

~ **exhausted** tamam/tamamilə yorulub əldən düşmək; *I'm utterly exhausted Mən yorulub tamam/ tamamilə əldən düşmüşəm; He's utterly ruined O. tamam müflisləşib; You are utterly mad Sən/Siz tamam/tamamilə dəlisən/dəlisiniz*
**uttermost** ['ʌtəmoust] *adj* = **utmost**
**uvula** ['ju:vjulə] *n (pl* **-ae**) *anat.* dilçək
**uvulae** ['ju:vjuli] *n* **uvula** *isminin cəm forması*
**uvular** ['ju:vjulə] *adj* **1.** dilçək, dilçəyə aid olan; **2.** *fon.* dilçək, dilçək vasitəsilə tələffüz edilən; ~ **consonants** dilçək samitləri
**uvulitis** [.ju:vju'laıtıs] *n tib.* dilçəyin iltihabı/ soyuqlaması
**uxorial** [ʌk'sɔ:rıəl] *adj* **1.** arvada/arvadlara aid (olan), arvad/arvadlar üçün səciyyəvi (olan); **2.** = **uxorious**
**uxoricide** [ʌk'sɔ:rısaıd] *n* **1.** arvadını öldürən, arvadının qatili; **2.** arvadını öldürmə
**uxorious** [ʌk'sɔ:rıəs] *adj* arvadını çox/bərk sevən, arvadı üçün əldən gedən/dəli-divanə olan; arvadına itaət edən
**Uzbek**[1] [uz'bek] *n* **1.** özbək; **the ~s** *top.i* özbəklər; **2.** özbək dili
**Uzbek**[2] [uz'bek] *adj* özbək; **the ~ language** özbək dili
**Uzbek**[3] [uz'bek] *adv* özbəkcə; **to speak ~** özbəkcə/ özbək dilində danışmaq; **to write in ~** özbəkcə /özbək dilində yazmaq



# Vv

**V, v**[1] [vi:] *n (pl* **V's, v's** [vi:z]) **1.** *ingilis əlifbasının 22-ci hərfi;* **2.** *amer. d.d.* beş dollar dəyərində kağız pul
**V, v**[2] [vi:] *adj* **1.** *Mürəkkəb sifətlərin komponenti kimi işlənir:* v-şəkilli, v-formalı, pazşəkilli, pazaoxşar, pazabənzər; **v-neck** v-formalı dekalte *(donda)*; **2.** qələbə əlaməti olaraq göstərilən işarə; **V-Day** qələbə günü; **v-sign** qələbə işarəsi *(barmaqları v şəklində yuxarı qaldırma)*
**vac** [væk] *n* I *d.d.* **vacation** *sözünün qısa forması*
**vac** [væk] *n* II **vacuum-cleaner** *sözünün qısa forması*
**vacancy** ['veıkənsı] *n* **1.** boşluq; **to stare into ~** gözünü boşluğa zilləmək; **2.** boş/tutulmamış yer; **a ~ in a warehouse** anbarda boş yer; **3.** laqeydlik, etinasızlıq, maraqsızlıq; kütlük, korazehinlik; huşsuzluq, dalğınlıq, unutqanlıq, diqqətsizlik; **~ of mind** ağlın kütlüyü; **~ of thought** fikrin dalğınlığı; **4.** qüsur, nöqsan, çatışmamazlıq; **a ~ in *one's* knowledge** bilikdə qüsur /çatışmamazlıq; **5.** vakansiya *(idarələrdə və s. boş/tutulmamış yer, vəzifə)*, boş yer; *We have a vacancy for a secretary Bizim boş katib (ə) yerimiz var;* **6.** boş yer *(mehmanxanada)*; *I'm sorry, we have no vacancies Bağışlayın, bizim boş yerimiz yoxdur; "No vacancies" "Boş yer yoxdur" (mehmanxanada elan)*
**vacant** ['veıkənt] *adj* **1.** boş, tutulmamış; **a ~ hotel room/seat** boş mehmanxana otağı/oturacaq *(teatrda və s.); Have you a room vacant? Boş otağın/otağınız varmı?* **2.** vakant, boş *(vəzifə haq.)*; **a ~ position** boş vəzifə; **~ professorship** vakant/boş professor vəzifəsi; **3.** boş/asudə vaxt; **~ hours** asudə saatlar; **idle and ~ life** mənasız və boş həyat; **4.** etinasız, ifadəsiz, laqeyd; diqqətsiz, huşsuz; mənasız; **~ eye** mənasız/etinasız baxış; **~ face** laqeyd/ifadəsiz sifət; **5.** *tex.* boş-boşuna işləyən *(mühərrik və s. haq.)*
**vacantly** ['veıkəntlı] *adv* laqeyd olaraq/tərzdə; mənasız olaraq, mənasız-mənasız; huşsuz/dalğın halda, diqqətsiz, fikri dalğın halda, dalğın-dalğın; **to look ~** dalğın-dalğın/laqeyd halda baxmaq
**vacate** [və'keıt] *v* **1.** boşaltmaq *(mənzili və s.)*; tərk etmək, çıxıb getmək; **to ~ an apartment** mənzili boşaltmaq, mənzildən köçmək; **to ~ premises** binanı boşaltmaq; **2.** istefaya çıxmaq, vəzifəni boşaltmaq, vəzifədən çıxmaq; **to ~ office** istefaya getmək; **to ~ command** *hərb.* komandir vəzifəsindən getmək, komandirliyi təhvil vermək; **3.** *hüq.* ləğv etmək, aradan qaldırmaq; **4.** *hərb.* köçürmək, evakuasiya etmək; **to ~ civilians from the city** mülki əhalini şəhərdən köçürmək/ evakuasiya etmək; **5.** *amer. d.d.* məzuniyyət/ kanikul keçirmək
**vacation**[1] [və'keıʃn] *n* **1.** (**of**) tərk etmə, boşaltma; **~ of a position** vəzifədən getmə, vəzifəni boşaltma, istefaya getmə; **2.** kanikul; məzuniyyət; fasilə *(işdə)*; **to be on ~** kanikulda/tətildə olmaq; *The students are on vacation Tələbələr kanikuldadırlar/ tətildədirlər*; **long/summer ~** yay kanikulu/tətili; **Christmas ~** milad/qış tətili; **two weeks' ~** ikihəftəlik məzuniyyət
**vacation**[2] [və'keıʃn] *adj* məzuniyyət, tətil, kanikul; **~ pay** məzuniyyət pulu; **~ time** məzuniyyət/tətil vaxtı
**vacation**[3] [və'keıʃn] *v amer.* məzuniyyət götürmək/ keçirmək; *He vacationed in Turkey O, məzuniyyətini /tətilini Türkiyədə keçirdi*
**vacationist** [və'keıʃnıst] *n* məzuniyyətçi, məzuniyyətdə olan adam, məzuniyyətə gedən adam
**vaccinate** ['væksıneıt] *v tib.* peyvənd etmək, vaksinləmək, çiçək peyvəndi vurmaq, çiçək döymək
**vaccination** [.væksı'neıʃn] *n tib.* çiçək döymə, peyvənd *(çiçəyə qarşı)*; **~ against smallpox** çiçəyə qarşı peyvənd
**vaccine** ['væksi:n] *n əcz.* vaksin *(yoluxucu xəstəliklərə qarşı müalicə peyvəndləri üçün qoruyucu maddə)*
**vacillate** ['væsəleıt] *v* **1.** tərəddüd etmək, qətiyyətsizlik göstərmək/nümayiş etdirmək; **to ~ between hope and fear** ümidlə qorxu arasında tərəddüd etmək/qətiyyətsizlik göstərmək; *She vacillated between hope and fear O. ümid və qorxu arasında qətiyyətsizlik göstərdi;* **2.** əsmək, tərpənmək, yellənmək *(divar və s. haq.)*; **to ~ on *one's* feet** ayaqları üstə möhkəm dayanmamaq/yırğalanmaq, valaylanmaq, valay vurmaq
**vacillating** ['væsıleıtıŋ] *adj* **1.** tərəddüd edən, qətiyyətsiz, qətiyyətsizlik göstərən/nümayiş etdirən; **2.** dəyişkən, sabit olmayan, qeyri-sabit, dəyişkən; **~ pulse** dəyişkən/qeyri-sabit nəbz; **3.** valaylayan, valay vuran; qətiyyətsiz, zəif; **~ steps** qətiyyətsiz/zəif addımlar; **4.** əsən, titrəyən *(işıq haq.)*
**vacillatingly** [.væsı'leıtıŋlı] *adv* tərəddüdlə, mütərəddid bir tərzdə/surətdə; qətiyyətsizliklə, qətiyyətsiz
**vacillation** [.væsı'leıʃn] *n* **1.** tərəddüd, qərarsızlıq, qətiyyətsizlik; şübhə; səbatsızlıq, mütərəddidlik, dəyişkənlik; **2.** titrəmə, əsmə *(işıq və s. haq.)*; laxlama, valaylama, valay vurma
**vacuity** [və'kju:ətı] *n* **1.** boşluq; **2.** mənasızlıq;

the ~ **of government decision** hökumət qərarının mənasızlığı; 3. boşboğazlıq, govəzəlik, lağlağı, naqqallıq
**vacuometer** [ˌvækjuːˈɔmɪtə^r] *n tex.* vakuometr *(seyrəkləşmiş qazların təzyiqini ölçən cihaz)*
**vacuous** [ˈvækjuəs] *adj* 1. boş, məzmunsuz, mənasız; ~ **remark** boş/mənasız irad; ~ **laugh** boş /gic gülüş; ~ **individual** boş/mənasız adam; 2. məqsədsiz; ~ **life** məqsədsiz həyat; 3. boş, doldurulmamış; ~ **space** boşluq, boş fəza
**vacuously** [ˈvækjuəslɪ] *adv* mənasız, mənasız olaraq, məzmunsuz, gic-gic, axmaq-axmaq, boş-boş
**vacuousness** [ˈvækjuəsnɪs] *n* boşluq, mənasızlıq, məzmunsuzluq
**vacuum**[1] [ˈvækjuəm] *n (pl* **vacuums**) 1. *fiz.* vakuum *(qazın seyrəklik halı)*, havasız məkan, boşluq, havasızlıq; **Torricellian** ~ Torriçelli boşluğu; *Nature abhors a vacuum Təbiət boşluğa dözmür*; 2. boşluq, boş yer, aralıq; **to fill the** ~ boşluğu/boş yeri doldurmaq; *There has been a vacuum in his life since his wife died Arvadı öləndən bəri onun həyatında bir boşluq var*; 3. *d.d.* = **vacuum-cleaner**
**vacuum**[2] [ˈvækjuəm] *v d.d.* tozsoranla təmizləmək; **to ~ the stairs/carpet** pilləkənləri/xalçanı tozsoranla təmizləmək; *She vacuumed the room O, otağı tozsoranla təmizlədi*
**vacuum bottle** [ˈvækjuəmˈbɔtl] *n* termos
**vacuum-brake** [ˈvækjuəmˈbreɪk] *n* vakuum əyləci/tormozu
**vacuum-clean** [ˈvækjuəmˈkliːn] *v* tozsoranla təmizləmək
**vacuum-cleaner** [ˈvækjuəmkliːnə^r] *n* tozsoran
**vacuum-cleaning** [ˈvækjuəmˈkliːnɪŋ] *n* tozsoranla təmizləmə
**vacuum-flask** [ˈvækjuəmflaːsk] *n* kiçik/balaca termos
**vacuum-pump** [ˈvækjuəmˈpʌmp] *n tex.* vakuum-nasos, vakuumlu nasos
**vagabond**[1] [ˈvægəbɔnd] *n* 1. sərsəri, səfil, avara; sərgərdan, yurdsuz *(adam)*; 2. fırıldaqçı, tülüngü; 3. *d.d.* veyl, tənbəl, yaramaz, avara, tüfeyli, müftəxor *(adam)*
**vagabond**[2] [ˈvægəbɔnd] *adj* 1. gəzən, sərsəri; köçəri, bir yerdə qərar tutmayan; ~ **life** köçəri həyat; ~ **gipsies** köçəri qaraçılar; 2. tənbəl, məqsədsiz; dağınıq; ~ **thoughts** dağınıq fikirlər
**vagabondage** [ˈvægəbɔndɪdʒ] *n* 1. sərsərilik, səfillik, avaralıq, sərgərdanlıq; köçəri həyat; 2. *top. i* sərsərilər, səfillər, avaralar
**vagarious** [vəˈgeərɪəs] *adj* 1. dəyişkən, qərarsız, səbatsız; qəribə, əcaib; ədabaz, şıltaq, nazlı; 2. gəzəyən; dolaşan, sərgərdan, veyl, avara
**vagary** [ˈveɪgərɪ] *n* şıltaqlıq, qəribəlik; ədabazlıq; **the vagaries of the weather** havanın şıltaqlığı
**vagina** [vəˈdʒaɪnə] *n (pl* **vaginas**) 1. *anat.* uşaqlıq/balalıq yolu; 2. *bot.* qın
**vaginal** [vəˈdʒaɪnl] *adj* uşaqlıq/balalıq yoluna aid olan; **a ~ infection** uşaqlıq/balalıq yolunun infeksiyası
**vagrancy** [ˈveɪgrənsɪ] *n* 1. sərsərilik etmə, dərbədər/sərgərdan gəzmə, köçəri həyat; 2. azma, yoldan azma; dəyişkənlik, səbatsızlıq; qəribəlik
**vagrant**[1] [ˈveɪgrənt] *n* 1. səfil, avara, sərgərdan, müəyyən məşğuliyyəti/sənəti olmayan adam *(fahişə və s. haq.)*; **a shelter for ~s** səfillər/avaralar üçün daldalanacaq; 2. səyyah, yolçu, sərsəri, dərbədər, cəlayi-vətən
**vagrant**[2] [ˈveɪgrənt] *adj* 1. gəzərgi, gəzən, səyahət edən; köçəri; ~ **musicians** gəzərgi musiqiçilər; ~ **tribes** köçəri qəbilələr; ~ **life** köçəri həyat; 2. sahibsiz, baxımsız, yurdsuz, kimsəsiz; ~ **boys** sahibsiz/kimsəsiz/ yurdsuz oğlanlar
**vague** [veɪg] *adj* (-r -st) 1. qeyri-müəyyən, qeyri-dəqiq, aydın/müəyyən olmayan, örtülü, anlaşılmaz; dumanlı; yanlış; ~ **answer** örtülü/ dumanlı/qeyri-müəyyən cavab; ~ **rumour** anlaşılmaz/örtülü şayiə; ~ **hope** dumanlı/aydın olmayan ümid; ~ **idea** dumanlı/aydın olmayan fikir; ~ **term** qeyri-dəqiq/yanlış termin; **to speak in ~ language** aydın olmayan/anlaşılmaz dildə danışmaq; 2. qətiyyətsiz, cəsarətsiz, mütərəddid *(adam haq.)*; *As usual he was vague Adəti üzrə ondan qəti cavab almaq mümkün olmadı*; 3. huşsuz, unutqan, dalğın, fikri dağınıq
**vaguely** [ˈveɪglɪ] *adv* 1. dumanlı, dumanlı bir tərzdə, qətiyyətsizliklə, cəsarətsiz bir surətdə; 2. huşsuz/laqeyd halda
**vagueness** [ˈveɪgnɪs] *n* 1. anlaşılmazlıq, dumanlılıq; 2. qətiyyətsizlik, cəsarətsizlik, mütərəddidlik; 3. huşsuzluq, dalğınlıq
**vain** [veɪn] *adj* (-er, -est) 1. əbəs, mənasız, səmərəsiz, bihudə, nahaq, faydasız; ~ **regret** əbəs /nahaq peşmançılıq; ~ **efforts** boş/bihudə/ əbəs /mənasız səylər; ~ **attempt** səmərəsiz/ mənasız cəhd; ~ **discussion** səmərəsiz/mənasız/ faydasız müzakirə; *It is vain for you to try Sən /Siz bihudə yerə çalışırsan/çalışırsınız*; 2. şöhrətpərəst, lovğa, özünübəyənən, özündən razı olan, özünü başqasından yuxarı tutan; **to be ~ of** ***smth.*** bir şeylə öyünmək/lovğalanmaq;
◊ **in** ~ boş/nahaq/əbəs yerə; *We protested in vain Biz boş/nahaq/əbəs yerə etiraz etdik; All our work was in vain Bizim bütün işimiz əbəs idi*
**vainglorious** [veɪnˈglɔːrɪəs] *adj* şöhrətpərəst, özünəvurğun, özünüöyən, öyünən, gopçu, lovğa
**vaingloriously** [veɪnˈglɔːrɪəslɪ] *adv* şöhrətpərəstcəsinə, lovğa, lovğa-lovğa, təkəbbürlə
**vainglory** [veɪnˈglɔːrɪ] *n* şöhrətpərəstlik, şöhrət düşkünlüyü, lovğalıq, özünə vurğunluq, özünə vurulma
**vainly** [ˈveɪnlɪ] *adv* 1. boş/nahaq/əbəs yerə, hədər, bihudə, səmərəsiz; *He was vainly trying to find the keyhole in the dark O, qaranlıqda açar deşiyini tapmaq üçün əbəs yerə çalışırdı*; 2.



özündən razı bir halda/tərzdə, məğrur-məğrur, lovğa-lovğa; *He was speaking vainly O lovğa-lovğa danışırdı*
**valediction** [ˌvælɪˈdɪkʃn] *n* ayrılma, vidalaşma, xudahafizləşmə, əlvida demə
**valedictory** [ˌvælɪˈdɪktərɪ] *adj* vidalaşma, vida; ~ **concert** vida konserti; **a ~ gift** vida hədiyyəsi
**valency** [ˈveɪlənsɪ] *n kim.* valentlik
**valentine** [ˈvæləntaɪn] *n* 1. ürək dostu/sirdaşı, sevgili, canan *(müqəddəs Valentin günündə seçilən; 14 fevral)*; 2. müqəddəs Valentin günündə zarafatyana yazılan məktub; 3. müqəddəs Valentin günündə sevgiliyə verilən hədiyyə; 4. müqəddəs Valentin günü *(qısa forması V)*; 5. *məc.* cütləşmə mövsümünün başlanması *(xüs. quşlarda)*
**valerian** [vəˈlɪərɪən] *n* 1. *bot.* valerian, pişikotu; pişikotunun kökü; 2. *əcz.* valerianka *(dərman)*
**valet**[1] [ˈvælɪt] *n* 1. kamerdiner, otaq xidmətçisi, lakey, nökər; 2. mehmanxanada paltar ütüləyən, təmizləyən və s. işlə məşğul olan xidmətçi
**valet**[2] [ˈvælɪt] *v* 1. lakey/kamerdiner işləmək; 2. kirayənişinə xidmət etmək *(mehmanxanada)*; 3. təmizləmək və ütüləmək *(kişi kostyumunu)*
**valiant**[1] [ˈvæljənt] *n* igid, qoçaq, qəhrəman, ürəkli *(adam)*; **the** ~ *top.i* igidlər, qoçaqlar, qəhrəmanlar
**valiant**[2] [ˈvæljənt] *adj* 1. qoçaq, igid, cəsur, mərd *(adam haq.)*; 2. qəhrəman, şücaətli *(hərəkət haq.)*
**valid** [ˈvælɪd] *adj* 1. *hüq.* həqiqi, əsl, gücü olan, qüvvədə olan *(qanun, müqavilə haq.)*; ~ **in law** qanuni qüvvəsi olan; ~ **ordinance** qüvvədə olan qərar; ~ **ballot papers** həqiqi bülletenlər; **to make** ~ təsdiq etmək, qüvvəyə mindirmək; **a ticket ~ for three months** üç ay qüvvədə olan bilet; ~ **until recalled** ləğv edilənə qədər qüvvədə olan; **time-table that is no longer** ~ qüvvədə olmayan/ ləğv olunmuş cədvəl; *The marriage was held to be valid Kəbinin qanuni/həqiqi olduğu etiraf edildi*; 2. əsaslı, əsaslandırılmış, tutarlı, inandırıcı, ciddi, mötəbər; ~ **claim** əsaslı/inandırıcı tələb; ~ **argument** əsaslı/tutarlı səbəb; ~ **proof** əsaslı/ inandırıcı sübut; ~ **criticism** ciddi/ əsaslı/tutarlı tənqid; 3. təsirli, effektli; ~ **method of testing/of investigating** ***smth.*** bir şeyi testdən keçirmənin/ tədqiq etmənin effektli metodu
**validate** [ˈvælɪdeɪt] *v* 1. *hüq.* ratifikasiya etmək; 2. təsdiq etmək *(səsvermənin nəticələrini və s.)*, seçilmiş olduğunu elan etmək; **to ~ a report** məlumatı təsdiq etmək; 3. hüquqi qüvvə vermək, həqiqi olduğunu elan etmək
**validity** [vəˈlɪdɪtɪ] *n* 1. *hüq.* qanunilik, qanunauyğunluq; həqiqət; **to dispute the ~ of a document** sənədin qanuniliyini qəbul etməmək; 2. inandırıcılıq, tutarlılıq, qətilik, əsaslılıq; ~ **of an argument** dəlilin inandırıcılığı/tutarlılığı/ əsaslılığı; ~ **of a conclusion** nəticənin əsaslılığı; 3. doğruluq; etibarlılıq; **the ~ of troops** qoşunun etibarlılığı
**valise** [vəˈliːz] *n* çamadan, sakvoyaj *(yol çantası)*
**valley** [ˈvælɪ] *n* 1. dərə; **down the** ~ dərə aşağı; **up the** ~ dərə yuxarı; 2. dəzgahların arası *(sexdə)*; 3. *tex.* nov, navalça
**valorize** [ˈvæləraɪz] *v* qiymət qoymaq/ müəyyənləşdirmək *(xüs. dövlət tədbirləri vasitəsilə)*
**valorous** [ˈvælərəs] *adj şair.* şanlı, rəşadətli, cəsur, qəhrəman
**valour** [ˈvælə^r] *n* şücaət, qəhrəmanlıq, igidlik, mərdlik
**valuable**[1] [ˈvæljuəbl] *n (adət. pl)* qiymətli şey, daş-qaş, cavahirat, qızıl-gümüş
**valuable**[2] [ˈvæljuəbl] *adj* 1. qiymətli, dəyərli; **a ~ picture** qiymətli/dəyərli şəkil; 2. əhəmiyyətli; *He gave me valuable information O mənə əhəmiyyətli məlumat verdi*; ~ **advice/help** əhəmiyyətli məsləhət/kömək
**valuation** [ˌvæljuˈeɪʃn] *n* qiymət; qiymət qoyma; **customs** ~ gömrük qiyməti/qiymət qoyması
**value**[1] [ˈvæljuː] *n* 1. dəyər, qiymət; qiymətli/dəyərli şey; **of no** ~ qiymətsiz, dəyərsiz, qiyməti olmayan *(yəni çox qiymətli)*; **to put much/little ~ upon** ***smth.*** bir şeyə yüksək/aşağı qiymət qoymaq, bir şeyi yüksək/aşağı qiymətləndirmək; *They paid him the value of his lost property Onlar onun itirilmiş əmlakının dəyərini ödədilər*; 2. *iqt.* dəyər; **surplus** ~ izafi dəyər; 3. məna *(söz və s.)*; 4. *riyaz.* kəmiyyət, miqdar; 5. *mus.* uzunluq *(notda)*; 6. *rəs.* şəkildə/tabloda işıqla kölgənin birləşməsi
**value**[2] [ˈvæljuː] *v* qiymətləndirmək, qiymət qoymaq; üstün tutmaq, qədrini bilmək; *He valued the house at $80.000 O, evə 80.000 dollar qiymət qoydu*; **to ~ smb.'s advice** bir kəsin məsləhətini qiymətləndirmək; **to ~ the truth above all else** həqiqəti hər şeydən üstün tutmaq; **to ~ health** sağlamlığın qədrini bilmək
**valued** [ˈvæljuːd] *adj* qiymətli, qiymətləndirilmiş; ~ **opinion** qiymətli fikir/rəy
**valueless** [ˈvæljuːlɪs] *adj* heç nəyə dəyməyən, gərəksiz, mənfəətsiz, dəyərsiz
**valuer** [ˈvæljuə^r] *n* qiymət qoyan/verən/təyin edən *(adam)*
**valve** [vælv] *n* 1. qapaq; ventil *(borularda, cihazlarda mayelərin, qazın, buxarın yolunu açıb bağlamaq üçün alət)*; 2. elektron lampa
**valved** [vælvd] *adj* laylı *(qapı və s.)*, klapanlı; klapanı olan
**vamp**[1] [væmp] *n* I *d.d.* avantürist/macəraçı/fırıldaqçı qadın/qız, yoldan/başdan çıxaran qadın /qız
**vamp** [væmp] *n* II çəkmə üzü
**vamp**[2] [væmp] *v* I 1. yeni/təzə üz çəkmək *(çəkməyə)*; 2. yamamaq, yamaqlamaq, yamaq salmaq, təmir etmək *(adət.* **to ~ up**); 3. kompilya-

siya etmək *(başqalarının əsərlərindən istifadə yolu ilə əsər yazmaq) (həm də* **to ~ up**); 4. *mus.* improvizasiya etmək

**vamp** [væmp] *v* II 1. tovlamaq, aldatmaq, başdan/yoldan çıxartmaq; 2. aldadıb pul qopartmaq

**vampire** ['væmpaɪəʳ] *n* 1. xortdan; 2. *məc.* qaniçən; zülmkar, zalım; 3. *zool.* yarasa *(cənubi Amerikada yaşayan)*; 4. hədə ilə/zorla/fırıldaqla başqasından pul qoparan adam

**van** [væn] *n* **vanguard** *sözünün qısa forması*

**vandal¹** ['vændəl] *n* 1. vəhşi, barbar *(mədəniyyət abidələrini məhv edən adam)*; 2. vandal *(V əsrin ortalarında Roma imperiyasını istila edərək onun mədəniyyət abidələrini məhv etmiş qədim german qəbilələrindən biri)*

**vandal²** ['vændəl] *adj* barbar; ~ **tribes** barbar qəbilələr

**vandalism** ['vændəlɪzəm] *n* vandalizm; vəhşilik, barbarlıq, mədəniyyətsizlik

**vandalize, -ise** ['vændəlaɪz] *v* incəsənət abidələrinə barbarcasına yanaşmaq, incəsənət abidələrini dağıtmaq/ məhv etmək

**vanguard** ['vænga:d] *n hərb. həm də məc.* baş dəstə, avanqard *(əsas qüvvənin qabağında gedən qoşun hissəsi)*

**vanilla** [və'nɪlə] *n bot.* vanil *(tropik bitki)*

**vanillin** ['vænɪlɪn] *n kim.* vanilin

**vanish** ['vænɪʃ] *v* yox/qeyb olmaq, gözdən itmək; *The thief vanished into the crowd Oğru camaatın içində/arasında yox oldu/gözdən itdi*

**vanity** ['vænɪtɪ] *n* 1. şöhrətpərəstlik, şöhrət düşkünlüyü; 2. boşluq, fanilik, mənasızlıq; **the ~ of human ambitions** insan şöhrətpərəstliyinin boşluğu/mənasızlığı; 3. = **vanity-bag**;

◊ **Vanity Fair** Şöhrətpərəstlik Bazarı, Şöhrət yarmarkası

**vanity bag** ['vænɪtɪ'bæg] *n* sumka, qadın sumkası *(xüs. gecə götürülən)*

**vanity box** ['vænɪtɪ'bɔks] *n* = **vanity bag**

**vanquish** ['væŋkwɪʃ] *v* 1. qalib/üstün gəlmək, qələbə çalmaq, udmaq, fəth/istila/zəbt/məğlub etmək; almaq; **to ~ the enemy** düşmənə qalib gəlmək, düşməni məğlub etmək; 2. qarşısını almaq, boğmaq, yatırmaq *(hissi və s.)*; **to ~ fear/passion** qorxunu/ehtirası boğmaq/yatırmaq

**vanquished** ['væŋkwɪʃt] *adj* 1. məğlub edilmiş/ olmuş; ~ **army** məğlub olmuş ordu; 2. boğulmuş, yatırılmış; ~ **temptations** boğulmuş/yatırılmış tamah; ~ **passion** boğulmuş/yatırılmış şəhvət

**vanquisher** ['væŋkwɪʃəʳ] *n* qalib, qalib gələn, müzəffər; fateh, istilaçı

**vantage** ['va:ntɪdʒ] *n* üstünlük, imtiyaz; **to have/to hold/to take** *smb.* **at a/the ~** bir kəs qarşısında üstünlüyə malik olmaq

**vantage-ground** ['va:ntɪdʒgraund] *n* = **vantage-point**

**vantage-point** ['va:ntɪdʒpɔɪnt] *n* münasib müşahidə nöqtəsi

**vapid** ['væpɪd] *adj* 1. dadsız, dadsız-duzsuz; ~ **food** dadsız yemək; ~ **beer** dadsız pivə; 2. maraqsız, cansıxıcı, cansıxan; ~ **conversation** maraqsız/ cansıxıcı söhbət; *The vapid conversation bored me Maraqsız söhbət məni təngə gətirdi*

**vapidity** [væ'pɪdɪtɪ] *n* 1. dadsızlıq, duzsuzluq, şitlik *(yemək və s. haq.)*; 2. maraqsızlıq, mənasızlıq *(söhbət və s. haq.)*, süstlük, ölüvaylıq

**vapidly** ['væpɪdlɪ] *adv* süst, ölüvay, həvəssiz, darıxdırıcı, maraqsız, cansıxıcı; mənasız, məzmunsuz; **to speak ~** mənasız/məzmunsuz danışmaq

**vapor¹** ['veɪpəʳ] *n amer.* = **vapour¹**

**vapor²** ['veɪpəʳ] *adj amer.* = **vapour²**

**vapor³** ['veɪpəʳ] *v amer.* = **vapour³**

**vaporable** ['veɪpərəbl] *adj* buxarlanan, buxara çevrilə bilən, buğlanan, buğa çevrilə bilə

**vaporimeter** [.veɪpə'rɪmɪtəʳ] *v tex.* vaporimetr *(müxtəlif maye buxarının təzyiqini ölçən cihaz)*

**vaporization, -isation** ['veɪpəraɪ'zeɪʃn] *n* buxarlanma; buxar əmələ gəlmə; buğa vermə; buxara/buğa verib təmizləmə

**vaporize, -ise** ['veɪpəraɪz] *v* 1. buğa/buxara vermək, buğa verib təmizləmək; 2. buxarlandırmaq, buxara/buğa çevirmək; 3. buxarlanmaq, buğlanmaq, buxara/buğa çevrilmək; 4. ürəyi sıxılmaq, darıxmaq, xiffət etmək, qüssələnmək

**vaporizer, -iser** ['veɪpəraɪzəʳ] *n* 1. buxarlandırıcı, buğlandırıcı *(mayeni buxarlandıran cihaz)*; 2. pulverizator *(mayeni toz halında fışqırtmaq üçün cihaz)*

**vaporous** ['veɪpərəs] *adj* 1. buxaraoxşar, buxarabənzər, buğabənzər, buğaoxşar; 2. dumanlı; buxarlı/buğla dolu; 3. qeyri-real, boş; ~ **ideas** qeyri-real fikirlər/ideyalar; ~ **conjecture** boş uydurma/xəyal; 4. aydın/aşkar olmayan, anlaşılmaz; ~ **style** anlaşılmaz üslub; 5. hava kimi yüngül *(parça haq.)*; ~ **fabric** kiseyi *(nazik şəffaf parça)*

**vapour¹** ['veɪpəʳ] *n* 1. buxar, buğ; buxarlanma, buğlanma; su buğu/buxarı *(həm də* **water ~**); **alcohol ~s** şərab/ çaxır buxarı; 2. duman, sis; **to disappear as ~** duman kimi yox olmaq; 3. xülya, xam xəyal, fantaziya, uydurma; **the ~s of a disordered mind** dumanlı beyinin fantaziyası

**vapour²** ['veɪpəʳ] *adj* buxar; ~ **pressure** buxar təzyiqi

**vapour³** ['veɪpəʳ] *v* 1. buxarlanmaq, buğlanmaq *(həm də* **to ~ away/forth/out/up**); 2. buraxmaq *(buğ, buxar, tüstü və s.)*; 3. boşboğazlıq/naqqallıq etmək, çənə/laqqırtı vurmaq, çərənləmək, boş-boş danışmaq *(həm də* **to ~ about**); 4. özünü öymək/tərifləmək, lovğalanmaq

**vapour-bath** ['veɪpə'ba:θ] *n* buxar hamamı, buğxana, buxarxana

**vapouring** ['veɪpərɪŋ] *adj* 1. özünü öyən, öyünən, lovğa, gopçu; 2. boş, mənasız, məzmunsuz *(nitq və s. haq.)*; təmtəraqlı, dəbdəbəli, ibarəli, qəliz; ~ **style** dəbdəbəli/təmtəraqlı üslub



**vapourish** ['veɪpərɪʃ] *adj* 1. özünü öyən, öyünən, lovğa; 2. dumanlı, sisli, duman basmış /bürümüş; tutqun; 3. vasvası, bədgüman, hər şeydən şübhələnən; ruh düşkünlüyündən/ ümidsizlikdən/ məyusluqdan əziyyət çəkən, melanxolik; 4. sarsılmış, məyus, dilxor

**vapour trail** ['veɪpə'treɪl] *n seyrək havada təyyarənin buraxdığı iz*

**vapoury** ['veɪpərɪ] *adj* 1. dumanlı, tutqun; 2. məyus, qəmgin, kədərli, hüznlü; 3. hava kimi, yüngül; qaz-qaz, çox şəffaf və yüngül *(parça haq.)*

**varan** ['værən] *n zool.* çöl kərtənkələsi

**variability** [.veərɪə'bɪlɪtɪ] *n* dəyişkənlik; qeyrisabitlik; ~ **of prices** qiymətlərin dəyişkənliyi/ qeyri-sabitliyi

**variable¹** ['veərɪəbl] *n* 1. *riyaz.* dəyişən kəmiyyət; 2. *dən.* dəyişkən/istiqamətini dəyişən külək

**variable²** ['veərɪəbl] *adj* dəyişkən, dəyişən; ~ **weather/speed/pressure/rainfall** dəyişkən hava/ sürət/təzyiq/ yağmur; ~ **mood/temper** dəyişkən ovqat/əhvali-ruhiyyə; *His mood is variable Onun ovqatı dəyişkəndir*

**variably** ['veərɪəblɪ] *adv* dəyişkən bir tərzdə, dəyişərək, dəyişkənliklə

**variance** ['veərɪəns] *n* 1. fikir ayrılığı, ixtilaf, küsmə, incimə; **to be at ~** 1) fikircə/rəycə ixtilafda olmaq; fikircə barışmamaq; *On that point we are at variance Bu məsələdə bizim fikrimiz müxtəlifdir/fərqlənir*; 2) küsülü olmaq; **to set at ~** konflikt yaratmaq, dalaşdırmaq, vuruşdurmaq, araya dava salmaq; 2. dəyişmə; 3. *biol.* növdən yayınma/fərqlənmə; 4. ayrılma, aralanma, düz/ uyğun gəlməmə, uyğunsuzluq

**variant¹** ['veərɪənt] *n* variant

**variant²** ['veərɪənt] *adj* müxtəlif, çeşidli, başqa-başqa, cürbəcür; ~ **results** müxtəlif/çeşidli /cürbəcür nəticələr

**variation** [.veərɪ'eɪʃn] *n* 1. dəyişmə; **~s of temperature** temperaturun dəyişməsi; 2. variant; növ müxtəlifliyi, əsas növün dəyişmiş forması; 3. *el.* dəyişmə; 4. *riyaz. mus.* variasiya

**varicoloured** ['veərɪ.kʌləd] *adj* 1. müxtəlifrəngli, rəngbərəng, alabəzək; 2. cürbəcür, çeşidli, dürlü-dürlü, müxtəlif

**variety** [və'raɪətɪ] *n* 1. cürbəcürlük, müxtəliflik, başqa-başqalıq, çeşidlilik; 2. hərtərəflilik, ətraflılıq, biliklilik, məlumatlılıq; *I was struck by the variety of his attainments Onun bilikliliyi/ məlumatlılığı məni heyrətə saldı/ heyran etdi*; 3. bir sıra/çox; **for a ~ of reasons** bir sıra/çox səbəbə görə, bir sıra səbəblərdən; 4. növ, sort; 5. = **variety show**

**variety entertainment** [və'raɪətɪ.entə'teɪnment] *n* = **variety show**

**variety show** [və'raɪətɪ'ʃou] *n* estrada tamaşası/ konserti

**variform** ['veərɪfɔ:m] *adj* müxtəlif/çeşidli formalı olan

**variola** [və'raɪələ] *n tib.* çiçək *(xəstəlik)*

**variolate** ['veərɪəleɪt] *v tib.* çiçək döymək

**variometer** [.veərɪ'ɔmɪtəʳ] *n el.* variometr *(bir sıra proseslərdə dəyişiklikləri ölçmək üçün işlədilən cihazların adı)*

**various** ['veərɪəs] *adj* 1. müxtəlif, çeşidli, cürbəcür; ~ **types** müxtəlif/çeşidli tiplər; ~ **names** müxtəlif/ cürbəcür adlar; **at ~ times** müxtəlif zamanlarda/ vaxtlarda; **to come across ~ peoples** müxtəlif/ cürbəcür adamlara rast gəlmək; ~ **reasons** müxtəlif/çeşidli səbəblər; *There are various reasons to think so Belə düşünməyə /düşünmək üçün müxtəlif səbəblər mövcuddur/var*; 2. hərtərəfli, hərcəhətli; ətraflı

**variously** ['veərɪəslɪ] *adv* hərtərəfli, ətraflı, ayrı-ayrı, müxtəlif tərəfdən/cəhətdən; *He was variously described as a hero and a genius O, qəhrəman və dahi kimi hərtərəfli təsvir edildi*

**varnish¹** ['va:nɪʃ] *n* lak; **nail ~** dırnaq lakı; **oil/ spirit ~** yağlı/spirtli lak; **to give the shelves a coat of ~** şkaflara lak çəkmək, şkafları laklamaq

**varnish²** ['va:nɪʃ] *v* 1. laklamaq, lak çəkmək /vurmaq *(həm də* **to ~ over**); **to ~ a chair/a table, etc.** stulu/stolu və s. laklamaq, stula/stola və s. lak çəkmək; 2. parlaqlıq/parıltı vermək, parıldatmaq, pardaqlamaq; 3. şirləmək, şir çəkmək *(saxsı məmulatlarına)*; 4. ört-basdır etmək, gizlətmək *(çatışmazlıqları)*

**varnished** ['va:nɪʃt] *adj* laklanmış, lak çəkilmiş; ~ **table/chair, etc.** laklanmış stol/stul və s.

**varnisher** ['va:nɪʃəʳ] *n* laklayıcı, lak çəkən/vuran usta

**varsity** ['va:sətɪ] *n* 1. *d.d.* universitet *(xüs. Kembric və Oksford)*; 2. universitet, kollec və ya məktəb idman komandası

**vary** ['veərɪ] *v (pt, pp* **varied**) 1. dəyişdirmək; **to ~ the diet** pəhrizi dəyişdirmək; 2. dəyişmək; *His mood varies from day to day Onun ovqatı gündən-günə dəyişir; Prices vary with the seasons Mövsümlərlə əlaqədar olaraq qiymətlər dəyişir*; 3. fərqlənmək; *The second edition varies little from the first İkinci nəşr birincidən az fərqlənir; The laws of France vary from those of England Fransanın qanunları İngiltərəninkilərdən/ İngiltərənin qanunlarından fərqlənir*; 4. cürbəcür etmək, müxtəlifləşdirmək; **to ~ programme/the methods** proqramı/metodları cürbəcür etmək

**vascular** ['væskjələʳ] *adj anat., bot.* damar, damarlı; ~ **disease** damar xəstəliyi

**vase** [va:z; veɪs, veɪz] *n* vaza, güldan

**vaseline** ['væsɪli:n] *n* vazelin

**vassal** ['væsəl] *n* 1. vassal; **great ~** kral vassalı; 2. asılı adam/ölkə; ~ **states** asılı dövlətlər

**vast¹** [va:st; væst] *n* genişlik, geniş yer/məkan, açıqlıq, ucsuz-bucaqsız sahə; **the ~ of ocean** okeanın genişliyi /ucsuz-bucaqsızlığı; **the ~ of the heaven** səmanın/göyün ucsuz-bucaqsızlığı

**vast**[2] [va:st; væst] *adj* 1. geniş, böyük, nəhəng, sonsuz, ucsuz-bucaqsız; ~ **space** sonsuz/ucsuz-bucaqsız fəza; ~ **territory** geniş/böyük ərazi; ~ **depth** sonsuz dərinlik; ~ **empires** nəhəng imperiyalar; **a man of ~ soul** geniş qəlbli adam; ~ **scale** geniş/böyük miqyas; **the ~ expanse of water/of desert/of sky** suyun/səhranın/səmanın ucsuz-bucaqsız genişliyi; ~ **plans** böyük planlar; 2. saysız, saysız-hesabsız; ~ **herds of cattle** saysız-hesabsız naxır; 3. *d.d.* çox geniş/böyük; ~ **knowledge** çox geniş bilik; ~ **difference** çox böyük fərq; ~ **sums of money/ of expense** çox böyük pul məbləği/xərc; *This gave me vast satisfaction Bu mənə çox böyük ləzzət verdi*

**vastitude** ['va:stɪtju:d; 'væs-] *n* genişlik, nəhənglik, ucsuz-bucaqsızlıq

**vastly** ['va:stlı; 'væs-] *adv d.d.* çox, lap hədsiz dərəcədə; *I am vastly obliged Mən çox/hədsiz dərəcədə minnətdaram*

**vastness** ['va:stnɪs; 'væs-] *n* böyüklük, irilik, yekəlik; genişlik

**vasty** ['va:stı; 'væs-] *adj şair.* böyük, nəhəng, dibsiz, çox/hədsiz dərin; ~ **deep** hədsiz dərinlik

**vat**[1] [væt] *n* 1. iri çəllək; 2. xəmir tabağı/təknəsi; 3. çən, bak; sistern

**vat**[2] [væt] *v* çəlləyə/çənə tökmək; çəlləklərdə saxlamaq *(şərabı və s.)*

**vatted** ['vætɪd] *adj* boçka, çəllək; çəlləkdə saxlanılmış *(şərab və s.)*; ~ **beer** boçka pivəsi

**vault**[1] [vɔ:lt] *n* I *mem.* 1. qübbə, tağ, tağtavan; **cloister** ~ monastır qübbəsi/tağtavanı; **the blue** ~ göy qübbəsi; 2. *anat.* qabıq; **cranial** ~ beyin qabığı; 3. sərdabə; **family** ~ ailə sərdabəsi; 4. zirzəmi, anbar; çaxır/şərab anbarı; 5. mağara

**vault** [vɔ:lt] *n* II tullanma, atdanma, sıçrama *(xüs. maneənin üstündən)*; ~ **over a wall** divarın üstündən tullanma

**vault**[2] [vɔ:lt] *v* I tullanmaq, atılmaq, tullanıb keçmək; o taya/o tərəfə hoppanmaq; **to ~ over a fence** tullanıb asardan o taya keçmək; **to ~ into the saddle** yəhərə atılmaq

**vault** [vɔ:lt] *v* II 1. *mem.* qübbə ilə örtmək, qübbə tikmək *(bir şeyin üstündə)*; 2. qübbə ilə örtülmək; 3. əyilmək; **to ~ like the rainbow** göy qurşağı/qövsi-qüzeh kimi əyilmək; *The sky waulted over the sea Səma dənizi qübbə kimi örtmüşdü*

**vaulted** ['vɔ:ltɪd] *adj* 1. qübbəli, tağlı; 2. günbəzşəkilli, qübbəşəkilli, günbəz kimi; qövsşəkilli, qövsəoxşar; ~ **vault** qövsşəkilli tağ

**vaulter** ['vɔ:ltəʳ] *n* hoppanma mütəxəssisi olan idmançı

**vaulting**[1] ['vɔ:ltɪŋ] *n* atdanma, sıçrama, hoppanma, tullanma

**vaulting**[2] ['vɔ:ltɪŋ] *adj* hoppanan, sıçrayan, tullanan, atdanan

**vaulty** ['vɔ:ltı] *adj* 1. tağlı; 2. günbəzşəkilli, qübbəşəkilli; günbəz kimi, qübbə/günbəz formalı

**vaunt**[1] [vɔ:nt] *n* lovğalıq, özünü öymə, öyünmə, lovğalanma; **to make a ~** özünü tərifləmək/öymək

**vaunt**[2] [vɔ:nt] *v* 1. **(of)** lovğalanmaq, özünü öymək/ tərifləmək, öyünmək; **to ~ of *one's* success** nailiyyəti ilə öyünmək/lovğalanmaq; 2. tərifləmək, tərifini göylərə qaldırmaq, həddən artıq tərifləmək

**vaunted** ['vɔ:ntɪd] *adj* nahaq mədh edilmiş/ təriflənmiş

**veal**[1] [vi:l] *n* dana əti; **fillet of ~** dananın can əti

**veal**[2] [vi:l] *v amer.* kəsmək üçün kökəltmək *(dananı)*; *He vealed the calf O, dananı kökəltdi*

**vegetable**[1] ['vedʒtəbl] *n* tərəvəz; *Tomatoes, beans and onions are vegetables Pomidor, lobya və soğan tərəvəzdir*; **green ~s** göyərti; tərəvəz *(kələm və s.)*; **a root ~** kökü olan tərəvəz *(məs. kök, kartof və s.)*; **a salad of ~s** tərəvəz salatı

**vegetable**[2] ['vedʒtəbl] *adj* 1. bitki; ~ **world/kingdom** bitki aləmi; ~ **oil** bitki yağı; 2. tərəvəz; ~ **dish** tərəvəz xörəyi; ~ **garden** dirrik, xır; ~ **gardening** dirrikçilik, xırçılıq, tərəvəzçilik; ~ **grower** dirrikçi, xırçı, tərəvəzçi

**vegetal** ['vedʒɪtl] *adj* bitki; **animal and ~ life** heyvan və bitki aləmi; fauna və flora

**vegetarian**[1] [ˌvedʒɪ'teərıən] *n* vegetarian, ət yeməyən adam

**vegetarian**[2] [ˌvedʒɪ'teərıən] *adj* 1. ətsiz; tərəvəz, bitki; 2. otyeyən *(heyvan haq.)*

**vegetarianism** [ˌvedʒɪ'teərıənızm] *n* vegetarianlıq, ətyeməzlik

**vegetate** ['vedʒɪteɪt] *v* 1. böyümək; boy atmaq; 2. bitmək *(bitki haq.)*; 3. mənasız/məqsədsiz həyat sürmək

**vegetation** [ˌvedʒə'teɪʃn] *n* 1. inkişaf, çıxma, bitmə; *Vegetation almost ceases in autumn Payızda inkişaf/ böyümə, demək olar ki, dayanır*; **to burst into ~** bitmək, çıxmaq *(bitki haq.)*; 2. bitki, nəbatat; yaşıllıq, göylük

**vegetative** ['vedʒɪtətıv] *adj bot.* vegetasiya; ~ **season** vegetasiya mövsümü; ~ **stage** vegetasiya dövrü/mərhələsi

**vehemence** ['vi:əməns] *n* 1. güc, böyük həvəs/ maraq, şövq; azğınlıq, coşğunluq, qızğın məhəbbət; ~ **of desires** arzuların coşğunluğu; ~ **of the wind/of the storm** küləyin /tufanın azğınlığı/ coşğunluğu; **fiery ~ of youth** gəncliyin şövqü/ coşğunluğu; **to speak with ~** coşğunluqla/böyük həvəslə danışmaq; **to defend *smth.* with ~** bir şeyi coşğunluqla müdafiə etmək; 2. hirs, acıq, qeyz, hiddət

**vehement** ['vi:əmənt] *adj* 1. bərk, güclü, şiddətli, ehtiraslı, qızğın, coşğun, hərarətli; ~ **desire** qızğın/coşğun arzu; ~ **speaker** qızğın/ehtiraslı natiq; ~ **wind** bərk/güclü/şiddətli külək; ~ **rage** qızğın qeyz/qəzəb/hirs; ~ **protest** bərk/qızğın/ coşğun etiraz; 2. kəskin; ~ **attack** kəskin hücum

**vehemently** ['vi:əməntlı] *adv* bərk, şiddətlə; coşğunluqla, qızğınlıqla, böyük həvəslə; **to speak ~** coşğunluqla /böyük həvəslə danışmaq



**vehicle** ['vi:əkl] *n* 1. nəqliyyat vasitəsi *(avtomobil və s.)*; 2. **(for, of)** vasitə, alət; **a ~ for/of propaganda** təbliğat vasitəsi/aləti; *Art may be used as a vehicle for propaganda İncəsənət təbliğat vasitəsi kimi istifadə edilə bilər; Language is the vehicle for conveying ideas Dil fikrin ifadə vasitəsidir*; 3. keçirici *(səs, işıq və s.)*; 4. *kim.* əridici, həlledici; 5. ötürücü; xəstəlik yayan; ~ **of disease** xəstəlik yayan

**vehicular** [və'hıkjuləʳ] *adj* 1. avtomobil, maşına aid olan; ~ **inspection** maşına/avtomobilə texniki baxış; ~ **tunnel** avtomobil yolu üçün tunel; *The road is closed to vehicular traffic Yol avtomobil hərəkəti üçün bağlıdır*; 2. daşıma, avtomobil nəqliyyatına aid olan; ~ **transport** daşıma/ avtomobil nəqliyyatı

**veil**[1] [veıl] *n* 1. duvaq; tor, tül *(qadın şlyapasına bənd edilən kiçik tor)*; **bridal ~** gəlinlik duvağı; *The bride dropped/raised her veil Gəlin duvağını aşağı saldı/qaldırdı*; 2. örtük, çadra, pərəncə *(orta Asiyada: çadra, çarşab)*; 3. örtük; pərdə; ~ **cloud** ~ bulud pərdəsi/örtüyü; **the ~ of darkness** qaranlıq örtüyü; **a ~ of mist** duman örtüyü; **to cast/to draw/to throw a ~ (over) 1)** örtük çəkmək; 2) sükutla keçmək, danışmamaq, gizlətmək; 4. *məc.* maska; bəhanə, pərdə; **under the ~ of *smth.*** bir şeyin bəhanəsi ilə; **the ~ of religion** din pərdəsi altında

**veil**[2] [veıl] *v* 1. duvaqla örtmək; bürümək, örtmək; *A thin mist veiled the hill Nazik duman dağı bürüdü/örtdü; She veiled her eyes with her hand O, əllərilə gözlərini örtdü*; **to ~ oneself** çadra örtmək; 2. gizlətmək, maskalamaq; **to ~ *one's* distrust/*one's* love/*one's* purpose** etimadsızlığını /məhəbbətini/məqsədini gizlətmək

**veiled** [veıld] *adj* 1. duvaqla/çadra ilə/pərəncə ilə örtülmüş; **a ~ Muslim woman** çadra/pərəncə örtmüş müsəlman qadını; 2. gizli, maskalanmış; ~ **hostility/love** gizlədilmiş düşmənçilik /məhəbbət; 3. dumanlı, aydın olmayan; ~ **passage** dumanlı/ aydın olmayan hissə *(kitabda)*; ~ **hint** aydın olmayan eyham

**veiledly** ['veılıdlı] *adv* xəlvəti, xəlvətcə; bilvasitə; dumanlı, anlaşılmaz/qeyri-müəyyən bir tərzdə

**vein** [veın] *n* 1. *anat.* vena *(qanı orqanlardan ürəyə gətirən damar)*; 2. qabiliyyət, meyl, istedad, bacarıq; **a ~ of humour, a humorous ~** yumor qabiliyyəti/meyli; **a ~ of cruelty** qəddarlıq meyli; 3. ruh, ton, üslub; **to speak in a serious ~** ciddi tonla danışmaq; 4. *bot.* damar *(yarpaqda)*; 5. *zool.* damar, damarcıq *(həşəratların qanadında)*; 6. *pl* naxış, damar *(oduncaqda)*

**veined** [veınd] *adj* 1. damarlı *(əl və s.)*; 2. damarlı, naxışlı *(mərmər və s.)*; ~ **wood** naxışlı/damarlı oduncaq

**veinous** ['veınəs] *adj* 1. damarlı; ~ **hands** damarlı əllər; 2. vena; ~ **blood** vena qanı

**veiny** ['veını] *adj* naxışlı, damarlı *(mərmər, oduncaq və s. haq.)*

**velar** ['vi:ləʳ] *adj fon.* damaqarxası; ~ **sounds** damaqarxası səslər

**velarization, -isation** [ˌvi:ləraı'zeıʃn] *n fon.* velyarlaşma *(dilin arxa hissəsinin damaq arxasına tərəf qaldırılması nəticəsində səsin dəyişməsi)*

**velocity** [və'lɔsətı] *n* 1. sürət; **initial ~** başlanğıc sürət; **the ~ of light/of sound /of wind** işığın/ səsin/küləyin sürəti; 2. tezlik, sürət; **to act with the ~ of thought** fikir tezliyi/sürəti ilə hərəkət etmək

**velodrome** ['vi:lədroum] *n* velodrom *(velosiped yarışları üçün meydança)*; **indoor ~** qış velodromu, örtülü velodrom

**velour**[1] [və'luəʳ] *n* velur *(zamşayaoxşar dəri)*

**velour**[2] [və'luəʳ] *adj* velur; **a ~ coat/hat** velur palto/ şlyapa

**velvet**[1] ['velvıt] *n* 1. məxmər; 2. *məc.* zəriflik, incəlik, yumşaqlıq; **the ~ of her skin** onun dərisinin zərifliyi/ yumşaqlığı

**velvet**[2] ['velvıt] *adj* 1. məxmər, məxmərdən tikilmiş; **a ~ dress** məxmər/məxmərdən tikilmiş paltar; 2. *məc.* zərif, incə, yumşaq, məxmər kimi yumşaq; ~ **skin** zərif/yumşaq dəri, məxmər kimi yumşaq dəri; 3. tünd *(rəng haq.)*; ~ **black** tünd-qara rəng;

◊ ~ **glove** xaricən yumşaq, lakin dönməz adam

**velveteen** ['velvı'ti:n] *n* velvet *(məxmərəoxşar pambıq parça)*

**velvety** ['velvıtı] *adj* 1. məxmər, məxməri, məxmər kimi; 2. tünd *(rəng haq.)*

**venal** [vi:nl] *adj* satqın, pula satılan; ~ **politicians** satqın siyasətçilər; ~ **lawyers/judges** pula satılan vəkillər /hakimlər; ~ **voters** pula satılan seçicilər

**venality** [vi:'nælıtı] *n* satqınlıq; rüşvətxorluq, korrupsiya *(məmurların satqınlığı/rüşvətxorluğu)*

**vendetta** [ven'detə] *n* qan intiqamı/davası

**vending-machine** ['vendıŋmə.ʃi:n] *n* ticarət avtomatı

**vendor** ['vendəʳ] *n* satıcı; **street ~s** küçə satıcıları, küçədə xırda şeylər satan satıcılar

**veneer**[1] [və'nıəʳ] *n* 1. şpon, birqatlı faner; 2. kərpic üzlük, kərpicdən üz çəkmə; 3. xarici parıltı/sığal; **a ~ of culture** mədəniyyət görkəmi, mədəniyyətin xarici görünüşü

**veneer**[2] [və'nıəʳ] *adj* faner; **a ~ clipper** faner qayçısı, fanerkəsən qayçı; **a ~ dryer** faner qurudan, faner qurutmaq üçün cihaz, faner qurudulan yer

**veneer**[3] [və'nıəʳ] *v* fanerləmək, üzərinə/üzünə faner çəkmək

**venerable** ['venərəbl] *adj* 1. möhtərəm, hörmətli, hörmətəlayiq; **a ~ old man** hörmətli/hörmətəlayiq qoca kişi/adam; **a ~ scholar** möhtərəm/hörmətli alim; 2. qədim, müqəddəs; ~ **ruins** qədim xarabalıqlar

**venerate** ['venəreɪt] *v* 1. hörmət etmək/bəsləmək, ehtiram göstərmək, hörmətlə yada salmaq/qeyd etmək/ anmaq; **to ~ old traditions** qədim adətlərə hörmət etmək/bəsləmək; **to ~ *smb.'s* memory** bir kəsin xatirəsini hörmətlə yada salmaq/anmaq; 2. baş əymək; **to ~ great men** böyük adamların qarşısında baş əymək

**veneration** [.venə'reɪʃn] *n* hörmət, ehtiram; baş əymə, pərəstiş, sitayiş etmə; **to have ~ to *smb./smth.*** bir kəsə/bir şeyə hörmət bəsləmək; **to hold *smth.* in ~** bir şey qarşısında baş əymək, bir şeyə pərəstiş etmək; **the ~ of images** bütlərə/ sənəmlərə pərəstiş etmə

**venerator** ['venəreɪtəʳ] *n* hörmət/pərəstiş edən adam; **~ of tradition** ənənəyə hörmət edən/ bəsləyən adam

**venereal** [vɪ'nɪərɪəl] *adj tib.* zöhrəvi; **~ disease** zöhrəvi xəstəlik; **~ disease dispensary** zöhrəvi xəstəlik dispanseri; **a ~ infection** zöhrəvi infeksiya; *Syphilis is a venereal disease Sifilis zöhrəvi xəstəlikdir*

**vengeance** ['vendʒəns] *n* **(on, upon)** intiqam, qisas; əvəz, cəza; **to take/to inflict ~ on/upon *smb.* for *smth.*** bir şeyə görə bir kəsdən intiqam/qisas almaq;

◊ **with a ~** çox, çox bərk; **to belabour *smb.* with a ~** bir kəsi yarımcan olana qədər döymək; *He is a demagogue with a vengeance O əsl demaqoqdur*

**vengeful** ['vendʒfl] *adj* intiqamçı, kinli, kinsaxlayan, qisasçı; qisas, intiqam; **~ weapon** qisas/intiqam silahı

**venial** ['vi:njəl] *adj* bağışlana bilən, bağışlanası, keçilən; xırda, cüzi *(günah, səhv haq.)*; **~ sin** bağışlana bilən/bağışlanan/keçiləsi günah; **~ offence** kiçik cinayət

**venison** ['venɪsn, 'venɪzn] *n* maral əti; **roasted ~** qızardılmış maral əti

**venom** ['venəm] *n* 1. zəhər *(adət. heyvanlarda)*; 2. *məc.* hirs, acıq, qəzəb; *She vented all her venom on us O bütün hirsini/zəhərini bizim üstümüzə tökdü*

**venomed** ['venəmd] *adj* zəhərli; **~ shaft** zəhərli ox *(həm də məc.)*

**venomous** ['venəməs] *adj* 1. zəhərli; **~ snake/spider/plants** zəhərli ilan/ hörümçək/ bitkilər; 2. *məc.* acıqlı, hirsli, kinli, zəhərli; **~ tongue** zəhərli dil

**venomously** ['venəməslɪ] *adv* acıqla, hirslə, qəzəblə, kinli-kinli; acıqlı-acıqlı

**venous** ['vi:nəs] *adj* vena; **~ blood** vena qanı

**vent**[1] [vent] *n* 1. *tex.* hava qapağı; 2. nəfəslik, buxarkeş; ventilyasiya deşiyi/dəliyi; 3. ifadə, ifadə etmə; **to give ~ to *one's* feelings** hisslərini ifadə etmək, ürəyini boşaltmaq; **to give ~ to *one's* impatience** hövsələdən çıxmaq; **to give ~ to *one's* grief** kədərlənmək, qüssələnmək; **to give ~ to *one's* anger** acıqlanmaq, acığı tutmaq; **to give ~ to *one's* indignation** hiddətlənmək, qəzəblənmək, qeyzlənmək; *She gave vent to a sigh O, canını tapşırdı; She gave vent to a cry of pain O, ağrıdan qışqırdı/bağırdı*; **to find ~ for *smth./in smth.*** bir şeyə əlac tapmaq, bir şeydən çıxış yolu tapmaq; *He found a vent for his anger in smashing the crockery O, qəzəbini qab-qacağı sındırmaqla yatırdı/söndürdü*

**vent**[2] [vent] *v* 1. deşiyi doldurmaq/tutmaq *(bir şeylə)*; 2. buraxmaq *(tüstü və s.)*; püskürmək; 3. boşaltmaq, tökmək; izhar etmək, söyləmək; **to ~ *one's* feelings** öz hisslərini izhar etmək; **to ~ *one's* anger** acığını tökmək; **to ~ *one's* grief in a torrent of tears** öz dərdini göz yaşı seli axıtmaqla izhar etmək/boşaltmaq; **to ~ *one's* anger on *smb.*** acığını bir kəsin üstünə tökmək

**ventage** ['ventɪdʒ] *n* 1. deşik, dəlik; 2. nəfəslik, buxarkeş *(buxarıda)*; 3. *mus.* yan deşik *(nəfəsli musiqi alətlərində)*

**venter** ['ventəʳ] *n* 1. ana bətni; doğma ana; **brothers/sisters of the same ~** doğma qardaşlar/ bacılar; **children by different ~s** müxtəlif anadan olan uşaqlar; 2. *anat., zool.* qarın, qarıncıq

**ventil** ['ventɪl] *n mus.* ventil *(nəfəsli musiqi alətlərində səsin yüksəkliyini dəyişdirən hissə)*

**ventilate** ['ventɪleɪt] *v* 1. havasını təmizləmək/ dəyişmək; havaya vermək; 2. baca qoymaq, qapaqla təmin etmək; 3. müzakirə etmək, aydınlaşdırmaq, izah etmək; **to ~ certain subjects** müəyyən məsələləri müzakirə etmək, bəzi mövzular haqqında danışmaq; 4. demək, bildirmək, aşkar etmək; **to ~ a grievance** çıxış edib şikayət bildirmək; 5. səpmək *(taxıl)*; 6. *arx.* üfürmək, yelləmək *(ocağı)*; 7. *fiziol.* qanı oksigenlə təmin etmək; *The lungs ventilate the blood Ağ ciyərlər qanı oksigenlə təmin edir*

**ventilation** [.ventɪ'leɪʃn] *n* 1. ventilyasiya, havanı dəyişmə *(otaqda, evdə, binada)*; havanın hərəkəti; 2. müzakirə *(xüs. açıq)*; **to enter upon the ~ of a question** məsələnin müzakirəsinə başlamaq; **questions calling for ~** müzakirə tələb edən məsələlər; *This matter requires ventilation Bu məsələ müzakirə tələb edir*; 3. *fiziol.* qanı oksigenlə təmin etmə; 4. *psixol.* gərginliyi azaltma *(fikir bildirmək yolu ilə)*

**ventilator** ['ventɪleɪtəʳ] *n* ventilyator, yelləyən *(cihaz)*

**ventricle** ['ventrɪkl] *n anat.* mədəcik *(ürəkdə, beyində)*

**venture**[1] ['ventʃəʳ] *n* 1. təhlükəli fikir/niyyət; avantüra, fırıldaq, macəra; **to run the ~** riskə getmək, risk etmək, qorxulu işə girişmək; **to decline a ~** təhlükəli fikirdən əl götürmək/ çəkmək; **to make a desperate ~ to do *smth.*** bir şeyi etmək üçün qızğın cəhd etmək; 2. spekulyasiya, alver; ticarət müəssisəsi; *One lucky venture made his fortune Bir uğurlu spekulyasiya onu varlandırdı; He failed in all his ventures Onun bütün müəssisələri uğursuzluğa düçar oldu*;



◊ **at a ~** bəxtəbəxt, təvəkkülə, hər nə cür gəldi; **to shoot at a ~** təvəkkülə atəş açmaq; **to answer at a ~** təvəkkülə/necə gəldi cavab vermək

**venture**[2] ['ventʃəʳ] *v* 1. risk etmək, təhlükədən qorxmayaraq hərəkət etmək; təhlükə altına qoymaq; **to ~ *one's* life** həyatını təhlükə altına qoymaq; 2. cəsarət/cürət etmək, cürətlənmək *(həm də* **to ~ on/upon)**; **to ~ on an opinion/on a protest** fikir söyləməyə /etiraz etməyə cürət etmək; **to ~ upon a new task** yeni işə başlamağa cəsarət/cürət etmək; 3. *tic.* möhtəkirlik/alver etmək, möhtəkirliklə/alverlə məşğul olmaq

**venturous** ['ventʃərəs] *adj* 1. qoçaq, cəsarətli, qorxmaz; **a ~ man** cəsarətli/qorxmaz adam; 2. təhlükəli, riskli; **~ crossing** təhlükəli keçid

**venue** ['venju:] *n* 1. görüş yeri *(danışıq üçün və s.)*; 2. *hüq.* məhkəmə dairəsi; 3. *id.* yarış yeri; **to change the ~** görüş/yarış yerini dəyişdirmək

**Venus** ['vi:nəs] *n* 1. *astr.* Venera, Zöhrə *(planet)*; 2. *məc.* gözəl, dilbər, sənəm; 3. sevgi və gözəllik ilahəsi *(qədim Roma əsatirində)*

**veracious** [və'reɪʃəs] *adj* 1. doğru, gerçək; **~ story** doğru əhvalat; 2. düz, düzgün, mötəbər; **~ news** düz/düzgün/mötəbər xəbər; **~ testimony** düz/ düzgün şahidlik

**veracity** [və'ræsɪtɪ] *n* doğruluq, gerçəklik, düzlük; *I don't doubt the veracity of your story Mən sənin/ sizin hekayətinin/hekayətinizin doğruluğuna şübhə etmirəm*

**veranda(h)** [və'rændə] *n* veranda, şüşəbənd, eyvan, balkon *(üstüörtülü)*; **to sit on the ~** verandada/ eyvanda /balkonda oturmaq

**verb**[1] [və:b] *n qram.* fel

**verb**[2] [və:b] *adj qram.* fel; **~ endings** fel sonluqları

**verbal**[1] ['və:bl] *n qram.* felin şəxssiz formaları *(məsdər, feli sifət, cerund)*

**verbal**[2] ['və:bl] *adj* 1. sözə aid olan, dilcavabı; **~ niceties** sözün çalarları; **~ error** söz səhvi; **~ dispute** söz haqqında mübahisə; 2. şifahi; **~ understanding** şifahi razılaşma/razılıq; **~ communication** şifahi məlumat; 3. hərfi, hərfi-hərfinə; **~ translation** hərfi tərcümə; 4. *qram.* fel, feli; **~ stem** fel əsası; **~ noun** feli isim; 5. *dip.* şifahi; **~ note** şifahi nota

**verbalism** ['və:bəlɪzm] *n* 1. pedantlıq, xırdaçılıq; quru rəsmiyyətçilik; 2. boş/mənasız sözlər; 3. uzunçuluq, sözçülük

**verbalist** ['və:bəlɪst] *n* 1. pedant, xırdaçı; hərfgüdən adam; 2. leksikanı kamil bilən

**verbality** [və:'bælɪtɪ] *n* 1. boş/mənasız sözlər; 2. *pl* frazeologiya

**verbalize, -ise** ['və:bəlaɪz] *v* 1. boşboğazlıq/ naqqallıq etmək; 2. sözlə ifadə etmək; **to ~ an idea** fikri sözlə ifadə etmək; 3. *qram.* felləşdirmək, felə çevirmək

**verbally** ['və:bəlɪ] *adv* 1. şifahi, sözlə; **to explain *smth.*** **~** bir şeyi şifahi/sözlə izah etmək; 2. hərfbəhərf, hərf-hərf, hərfən; tam mənası ilə; **to translate a letter ~** məktubu hərfbəhərf tərcümə etmək; 3. ancaq sözdə, formal olaraq; görkəm üçün

**verbatim**[1] [və:'beɪtɪm] *n* stenoqram *(stenoqrafik yazı)*

**verbatim**[2] [və:'beɪtɪm] *adj* 1. hərfi, sözbəsöz, hərfi-hərfinə, eynən, eynilə; **~ translation** hərfi tərcümə; 2. stenoqrafik; **~ report** stenoqram, stenoqrafik hesabat

**verbatim**[3] [və:'beɪtɪm] *adv* hərfiyyən, eynən, hərfi-hərfinə, nöqtəbənöqtə

**verbiage** ['və:bɪɪdʒ] *n* uzunçuluq, sözçülük; boşboğazlıq, laqqırtı, ibarəbazlıq; **mere ~** sadəcə boşboğazlıq/ laqqırtı

**verbose** [və:'bous] *adj* uzun, uzunçu, uzundanışan; **a ~ statement** uzun bəyanat

**verbosity** [və:'bɒsɪtɪ] *n* 1. uzunçuluq, sözçülük; 2. *pl* boş frazalar

**verdant** ['və:dnt] *adj* yaşıl; **~ parks/fields** yaşıl parklar/çöllər; **~ grass** yaşıl ot; **~ avenues** yaşıl xiyabanlar

**verdict** ['və:dɪkt] *n* 1. *hüq.* hökm, qərar; **arbitral ~** arbitraj qərarı; **to deliver /to give a ~** hökm çıxartmaq, qərar vermək; 2. nəticə, fikir, rəy; **the popular ~** ictimaiyyətin fikri/rəyi; *The doctor has not yet given his verdict Həkim öz fikrini hələ söyləməyib/deməyib (xəstənin vəziyyəti haq.)*

**verdure** ['və:dʒəʳ] *n* 1. yaşıl rəng; **laurels of eternal ~** dəfnənin həmişəlik yaşıllığı/yaşıl rəngi; 2. yaşıl bitki

**verdurous** ['və:dʒərəs] *adj* yaşıl, yaşıllaşan; **~ hills/ mountains** yaşıl/yaşıllaşan təpələr/dağlar; **~ pastures** yaşıl örüşlər

**verge**[1] [və:dʒ] *n* 1. kənar, qıraq; **the ~ of a road/ path** yolun/cığırın kənarı; 2. *məc.* hədd; **to be on the ~ of *smth.*** bir şeyin həddində olmaq; **on the ~ of war** müharibə həddində; **to be on the ~ of bursting into tears** ağlamaq həddində olmaq; *She tried to hide her grief, but she was on the verge of tears O, kədərini gizlətməyə çalışdı, lakin o ağlamaq həddində idi*; 3. hüdud; sərhəd, son hədd /pillə; **within the ~ of the country** ölkənin sərhədi/hüdudu daxilində; 4. bordyur *(ləkin kənarında, yol boyu)*

**verge**[2] [və:dʒ] *v* **(on, upon)** həmsərhəd/yanaşı/ qonşu olmaq; *At that point the estate verges on the sea Bu nöqtədə/yerdə malikanə/mülk dənizə yaxındır*

**verger** ['və:dʒəʳ] *n* kilsə xadimi/qulluqçusu

**verifiable** ['verɪfaɪəbl] *adj* təsdiq olunan/oluna bilən; **~ facts** təsdiq olunan/oluna bilən dəlillər

**verification** ['verɪfɪ'keɪʃn] *n* 1. yoxlama, nəzarət; tədqiqat; 2. təsdiq etmə, həqiqiliyini aşkara çıxarma

**verify** ['verɪfaɪ] *v (pt, pp* **-fied)** 1. yoxlamaq, nəzarət etmək; **to ~ an account/figures** hesabatı rəqəmləri yoxlamaq; 2. təsdiq etmək; *Subsequent events verified his suspicion Sonrakı hadisələr onun şübhələrini təsdiq etdi*

**verisimilitude** [ˌverɪsɪˈmɪlɪtju:d] *n* **1.** doğruya oxşarlıq, həqiqətə uyğunluq; **the ~ of the tale** hekayənin həqiqətə oxşarlığı; **2.** mümkünlük, ehtimal; **3.** doğruluq, gerçəklik, yəqinlik, səhihlik; **4.** *pl* uydurma; **~s of fiction** roman yazanların uydurmaları
**veritable** [ˈverɪtəbl] *adj* həqiqi, əsl, xalis; *We had a veritable deluge Bizdə əsl sel oldu; He is a veritable tyrant O əsl /həqiqi müstəbiddir; He is a veritable fool O həqiqi səfehdir/axmaqdır*
**veritably** [ˈverɪtəblɪ] *adv* həqiqətən, doğrudan da, doğrudan-doğruya
**verity** [ˈverɪtɪ] *n* həqiqət, həqiqilik, doğruluq; **~ and falsity** həqiqət və saxtakarlıq; **the ~ of miracles** möcüzənin doğruluğu/həqiqiliyi; **the eternal verities** əbədi həqiqətlər; **to attest the ~ of the presidential signature** prezidentin imzasının həqiqiliyini təsdiqləmək
**vermicelli** [ˌvə:mɪˈtʃelɪ] *n* vermişel, əriştə
**vermilion**[1] [vəˈmɪlɪən] *n* tünd-qırmızı rəng
**vermilion**[2] [vəˈmɪlɪən] *adj* tünd-qırmızı
**vermin** [ˈvə:mɪn] *n top. i* **1.** parazitlər *(bit, birə, gənə və s.)*; **2.** yırtıcılar *(heyvanlar, quşlar)*; **3.** ziyanvericilər; *Crocodiles are vermin Timsahlar ziyanvericidir*
**verminate** [vəˈmɪneɪt] *v* qurdlamaq, qurd salmaq
**vermination** [ˌvə:mɪˈneɪʃn] *n* qurdluluq, qurd salma, qurdlama
**verminous** [ˈvə:mɪnəs] *adj* **1.** parazitlə dolu, bitli, birəli; **2.** *k.t.* ziyanvericilərlə dolu; **3.** iyrənc, çirkin, çox pis, mənfur; **4.** *tib.* parazitlərlə keçən/ yoluxan *(xəstəlik haq.)*
**vermouth** [ˈvə:məθ] *n* vermut *(içki növü)*
**vernacular**[1] [vəˈnækjələr] *n (adət.* **the vernacula)** **1.** ana dili, milli dil; **our own ~** bizim öz ana dilimiz; **2.** danışıq dili; **3. (the ~)** yerli ləhcə; **the ~s of the USA** ABŞ-ın ləhcələri; **(the ~)** peşə dili, jarqon; **the ~ of the stage** səhnə jarqonu
**vernacular**[2] [vəˈnækjulər] *adj* **1.** milli, xalq, ana, doğma *(dil haq.)*; **the botanical and the ~ names for flowers** çiçəklərin botaniki və xalq adları; *English is vernacular tongue of the USA İngilis dili ABŞ-ın milli dilidir*; **2.** yerli; **the ~ languages of India** Hindistanın yerli dilləri; **~ disease** yerli xəstəlik; **3.** danışıq *(dil haq.)*, loru *(dil haq.)*; **~ Arabic** danışıq/xalq ərəb dili, loru ərəb dili; **4.** ana dilində yazılmış ədəbiyyat; **our ~ literature** bizim ana dilimizdə yazılmış ədəbiyyat; **5.** yerli dialektdə deyilmiş və ya yazılmış; **~ poetry** dialektdə yazılmış şerlər
**vernacularism** [vəˈnækjulərɪzm] *n* yerli söz və ya ifadə; dialektizm
**vernal** [ˈvə:nl] *adj şair.* yaz; **~ season** yaz fəsli; **the ~ equinox** yazda gecə-gündüzün bərabərliyi
**versatile** [ˈvə:sətaɪl] *adj* **1.** hərtərəfli, hərcəhətli; **~ genius** hərtərəfli dahi/düha; **~ writer** hərtərəfli yazıçı *(müxtəlif janrlarda yazan)*; **~ actor** müxtəlif rollarda oynayan aktyor; **~ mind** iti ağıl; **2.** qeyri-sabit, dəyişkən; laxlayan; **~ loyalty** dəyişkən/ qeyri-sabit sədaqət; **3.** universal, çoxməqsədli; asan uyğunlaşan; **~ mobility** *hərb.* universal çeviklik *(suda, havada, quruda)*; **~ aircraft** *av.* çoxməqsədli təyyarə
**versatility** [ˌvə:səˈtɪlətɪ] *n* **1.** hərtərəflilik, çoxcəhətlilik; **2.** dəyişkənlik, qərarsızlıq, dönüklük, vəfasızlıq, səbatsızlıq; qeyri-sabitlik; **3.** *tex.* universallıq, manevr etmə qabiliyyəti
**verse**[1] [və:s] *n* **1.** misra; **a stanza of six ~s** altı misralı bənd/beyt; **2.** ölçü, vəzn, şer forması; **iambic ~** yamb tərzində yazılmış misra, yamb *(vurğusu ikinci hecada olan ikihecalı şer vəzni)*; **3.** beyt, bənd *(şerdə)*; **a poem of five ~s** beş beytdən/ bənddən ibarət şer; **4.** poeziya, şer; **prose and ~** nəsr və poeziya; **written in ~** şerlə yazılmış
**verse**[2] [və:s] *v* şer yazmaq; fikrini şerlə demək/ifadə etmək; **to ~ one's love** sevgisini şerlə ifadə etmək/ demək
**versification** [ˌvə:sɪfɪˈkeɪʃn] *n* **1.** şer üsulu/sənəti; şairlik sənəti, nəzmə çəkmə; **2.** şer formasına salma, mənzum formaya salma
**versifier** [ˈvə:sɪfaɪər] *n* qafiyəpərdaz, şer texnikasını yaxşı bilməyən/istedadsız şair
**versify** [ˈvə:sɪfaɪ] *v (pt, pp* **-fied)** **1.** şer yazmaq/ demək; **2.** şer formasına salmaq *(bədii əsəri)*; **3.** şer formasında yazmaq, şer formasına salmaq *(bədii əsəri)*; **to ~ a tale** nağılı şer formasına salmaq
**version** [ˈvə:ʃn] *n* **1.** mətnin variantı *(tərcümə və ya orijinal)*; **the English ~ of the Bible** Bibliyanın ingilis dili variantı/ingilis dilinə tərcüməsi; **the original ~** orijinal variant/mətn; **the Azerbaijani ~ of the treaty** müqavilənin Azərbaycan variantı/ dilində mətni; **2.** variant, hekayət *(bir şey haq.)*; **two ~s of an affair** bir əhvalat haqqında iki hekayət
**verso** [ˈvə:sou] *n (pl* **-os** [-ouz]) **1.** *poliqr.* cüt səhifə, açıq kitabın sol səhifəsi; **2.** tərs/arxa tərəf *(medalda, sikkədə)*
**versus** [ˈvə:səs] *prep.* **1.** *id.* qarşı; **Dynamo ~ Arsenal** Dinamo Arsenala qarşı; **2.** zidd, əks, müqayisədə, əksinə; **man-made fibres ~ natural fibres** süni lif təbii liflə müqayisədə; **to debate the question of free trade ~ protection** himayəçiliyin ziddinə olaraq azad ticarət məsələsini müzakirə etmək
**vertebra** [ˈvə:tɪbrə] *n (pl* **-rae** [-ri:]) *anat.* **1.** fəqərə, fəqərə sümüyü; **2.** *pl anat.* onurğa, bel sütunu/ sümüyü
**vertebrae** [ˈvə:tɪbri:] **vertebra** *isminin cəm forması*
**vertebral** [ˈvə:tɪbrəl] *adj anat.* onurğa, bel; onurğa/bel sütunu
**vertebrata** [ˌvə:tɪˈbra:tə] *n* **(the ~)** *zool.* onurğalılar, onurğalı heyvanlar
**vertebrate**[1] [ˈvə:tɪbrət] *n zool.* onurğalı heyvan; *Mammals are vertebrates Məməli heyvanlar*



*onurğalıdır; Birds, reptiles and fishes are vertebrates, too Quşlar, sürünənlər və balıqlar da onurğalılardır*
**vertebrate**[2] [ˈvə:tɪbrət] *adj* **1.** *zool.* onurğalı; **2.** *məc.* davamlı, möhkəm, dayanıqlı; **3.** *məc.* çevik, canlı, zirək, cəld
**vertex** [ˈvə:teks] *n (pl* **vertices)** **1.** *astr.* zenit *(müşahidəçinin başı üstündə təsəvvür edilən ən uca xəyali nöqtə)*; **2.** *riyaz.* təpə; **3.** kəllə, zirvə; **a monument on the ~ of the hill** təpənin zirvəsində abidə; **4.** *anat.* əmgək
**vertical**[1] [ˈvə:tɪkl] *n* **1.** vertikal; şaquli/dik xətt; **2.: the ~** *riyaz.* perpendikulyar
**vertical**[2] [ˈvə:tɪkl] *adj* **1.** *riyaz.* perpendikulyar; **~ line** perpendikulyar xətt; **2.** dik, şaquli; **~ cliffs** dik qayalar; **~ rays of the sun** günəşin şaquli şüaları; **3.** *anat.* əmgək; **~ bone** əmgək sümüyü
**verticality** [ˌvə:tɪˈkælɪtɪ] *n* vertikallıq, şaquliliк, diklik
**vertically** [ˈvə:tɪkəlɪ] *adv* vertikal, şaquli, dik; vertikal/şaquli/dik vəziyyətdə
**vertices** [ˈvə:tɪsi:z] **vertex** *isminin cəm forması*
**vertigines** [və:ˈtɪdʒɪni:z] **vertige** *isminin cəm forması*
**vertiginous** [və:ˈtɪdʒɪnəs] *adj* **1.** başgicəldən, başgicəlləndirən, başgicəlləndirici *(həm də məc.)*; **~ height** başgicəlləndirən / başgicəlləndirici yüksəklik; **2.** başgicəllənməsi hiss edən; **~ attacks** başgicəllənmə tutması; *He felt vertiginous O, başgicəllənmə hiss etdi, Onun başı gicəldi*
**vertiginousness** [və:ˈtɪdʒɪnəsnɪs] *n* başgicəllənmə, başgicəllənməsi
**vertigo** [və:ˈtɪgou] *n (pl* **-oes** [-ouz]) başgicəllənmə
**verve** [və:v] *n* həvəs, şövq; şuxluq, zirəklik; parlaqlıq, aydınlıq *(təsvirdə)*; qüvvət, güc; **to do *smth.* with ~** bir şeyi həvəslə/şövqlə etmək; **to play with ~** həvəslə/şövqlə çalmaq *(musiqi alətini)*
**very**[1] [ˈverɪ] *adj* **1.** əsl, həqiqi, tam; mütləq; **the ~ truth** əsl/tam/mütləq həqiqət; *He has shown himself a very knave O özünü əsl/tam dələduz kimi göstərib*; **a ~ rogue** əsl/həqiqi fırıldaqçı; **the ~ reverse (of)** tam/mütləq əkslik/ziddiyyət; *This is the very reverse of the truth Bu, həqiqətin tam əksidir*; **2.** həmin; **the ~ man I saw yesterday** mənim dünən gördüyüm həmin adam/kişi; *This is the very place where I found the book Bu mənim kitabı tapdığım həmin yerdir; I live in this very house Mən həmin bu evdə yaşayıram*; **3.** ən, lap; **the ~ top/middle/ end/beginning** lap kəllə/ orta/ son/başlanğıc; **the ~ thing** lap lazım olan şey; *This is the very thing for headache Bu, başağrısı üçün əsl vasitədir; It grieves me to the very heart Bu mənim lap qəlbimi/ürəyimi incidir*; **4.** hətta; *The very children knew it Bunu hətta uşaqlar da bildi;*
◊ **in ~ deed** həqiqətən, şübhəsiz, əslində; **in ~ truth** həqiqətən, doğrudan-doğruya, doğrudan da; **the ~ man** yarayan adam; **to catch in the ~ act** cinayət yerində/üstündə tutmaq/ yaxalamaq; *I saw him in the very act of taking it Mən onun bunu götürdüyünü öz gözlərimlə gördüm*
**very**[2] [ˈverɪ] *adv* **1.** çox, artıq, olduqca, dedikcə, son dərəcə; **~ difficult** çox/olduqca/dedikcə /son dərəcə çətin; **~ slowly** çox/olduqca/son dərəcə yavaş; **a ~ trying time** çox/son dərəcə ağır vaxt; *I was very much pleased Mən artıq dərəcədə şad idim; He was very much surprised O çox/son dərəcə heyrətləndi/təəccübləndi*; **2.** xeyli, daha, daha da, çox-çox; *I feel much better today Bu gün mən özümü xeyli/daha da yaxşı hiss edirəm; It is very much warmer now İndi xeyli istidir*; **3.** ən, lap; **the ~ first** lap birinci; **the ~ last** ən axırıncı; **the ~ best** ən yaxşı; **4.** düz, dəqiq;
◊ **~ good 1)** çox yaxşı, əla; **2)** yaxşı *(razılıq)*; **3)** oldu *(əmrə cavab)*
**vesical** [ˈvesɪkl] *adj anat.* **1.** sidik kisəsinə aid olan; **2.** qabarıqlı, qabarcıqlı, qabarıq-qabarıq olan
**vesicle** [ˈveskl] *n anat., biol.* qovuqcuq, qabarcıq, suluq
**vessel** [ˈvesl] *n* **1.** qab; **measuring ~** ölçü qabı, menzurka *(maye ölçmək üçün dərəcələrə bölünmüş stəkan)*; **2.** gəmi; **war ~** hərbi gəmi; **fishing ~** balıq ovu gəmisi; **motor ~** teploxod *(daxili yanacaqlı motorla hərəkət edən gəmi)*; **3.** *anat.* damar; **blood ~** qan damarı
**vest**[1] [vest] *n* **1.** alt köynəyi; **2.** gödəkcə, jilet *(pencək altından geyilən qısa qolsuz geyim)*; **3.** döşlük *(kişi və ya qadın paltarına tikilən)*; **4.** alt koftası; **5.** xalat *(şərqdə geyilən)*; **6.** *şair.* paltar, geyim
**vest**[2] [vest] *v* **(with, in)** vermək *(hakimiyyət, hüquq və s.)*; üzərinə məsuliyyət qoymaq; **to ~ a person with rights** bir kəsə hüquq vermək; **to ~ *smb.* with authority, to ~ power in *smb.*** bir kəsə hakimiyyət vermək; **to be ~ed with a right** ixtiyarı/hüququ olmaq; Authority vested in the people Xalqa məxsus olan hakimiyyət
**vested** [ˈvestɪd] *adj* əsaslandırılmış, qanuni; **~ right** *hüq.* qanuni/şərtsiz hüquq
**vestibular** [vesˈtɪbjulə] *adj anat.* vestibulyar; **~ system** vestibulyar sistem
**vestibule** [ˈvestɪbju:l] *n* **1.** dəhliz, vestibül; **the ~ of a church/of a hotel** kilsənin/mehmanxananın dəhlizi/ vestibülü; **2.** *anat.* dəhliz
**vestige** [ˈvestɪdʒ] *n* **1.** qalıq, iz; **the last ~s of the old colonial regime** köhnə müstəmləkə rejiminin son qalıqları; **~s of an earlier civilization** erkən sivilizasiyanın izləri/qalıqları; **2.** hissə, zərrəcik, zərrə, bir zərrə; **a ~ of truth** həqiqətin zərrəciyi, bir zərrə həqiqət; *There's not a vestige of truth in the rumour Şayiədə bir zərrə həqiqət yoxdur*
**vestigial** [ˈvestɪdʒɪəl] *adj* itən, itməkdə olan; **~ traces of an earlier culture** erkən mədəniyyətin itməkdə olan izləri

**vestment** ['vestmənt] *n* geyim, libas, paltar, mərasim paltarı/libası *(xüs. keşişlərin kilsədə geyindikləri)*
**vestry** ['vestrı] *n* keşiş cübbələrinin saxlanıldığı yer *(kilsədə)*
**vet¹** [vet] *n d.d.* baytar, mal həkimi
**vet²** [vet] *v* (-tt-) **1.** heyvanı müalicə etmək, baytar müayinəsindən keçirmək; **to have a horse ~ted** atı baytar müayinəsindən keçirmək; **2.** baytar olmaq; **3.** yoxlamaq, yoxlamadan keçirmək; **to ~ a manuscript** əlyazmanı yoxlamaq/təkrar nəzərdən keçirmək/düzəltmək
**vetch** [vetʃ] *n bot.* çölnoxudu *(yemotu)*
**veteran¹** ['vetərən] *n* **1.** veteran; **war ~s** müharibə veteranları; *My grandfather is a veteran of the Second World War Mənim babam İkinci Dünya müharibəsinin veteranıdır;* **2.** *amer.* müharibə iştirakçısı; cəbhəçi *(cəbhədə vuruşan və ya vuruşmuş adam)*; **~s of World War II** İkinci Dünya müharibəsi iştirakçıları; **young ~s** gənc cəbhəçilər
**veteran²** ['vetərən] *adj* **1.** veteran, qoca, döyüşdə sınaqdan çıxmış; **a ~ politician** veteran siyasətçi; **~ teacher** veteran/qoca müəllim; **2.** uzun illər sürən/davam edən; **~ service to the nation** ölkəyə uzun illər xidmət; **3.** *amer.* müharibədə iştirak etmiş, tərxis olunmuş *(ordudan)*; **~ benefits** tərxis olunanlara verilən imtiyazlar/güzəştlər
**veterinary¹** ['vetrənrı] *n* baytar, baytar həkim
**veterinary²** ['vetrənrı] *adj* baytar; **~ medicine/science** baytarlıq, baytarlıq elmi; **a ~ surgeon** baytar həkim; **a ~ hospital** heyvanlar üçün müalicəxana
**veto¹** ['vi:tou] *n (pl* **-oes** [-ouz]) **1.** veto; **absolute ~** absolyut/tam veto; **suspensory ~** dayandırıcı veto; **to put/to place/to set a ~ on/upon** *smth.* bir şey üzərinə veto qoymaq; **to have the power/the right of ~** veto gücü/ hüququ olmaq; *The President has the veto on legislation Prezidentin qanunvericilik üzərinə veto qoymaq hüququ var;* **2.** qadağa, yasaq; *Father put a veto on our staying out late Atam bizim evə gec gəlməmizə qadağa qoydu*
**veto²** ['vi:tou] *v* **1.** veto qoymaq *(bir şey üzərinə)*; **to ~ a proposal/a bill/a resolution** təklifə/qanun layihəsi/ qətnamə üzərinə veto qoymaq; **2.** qadağan/yasaq etmək; *The police vetoed the procession Polis nümayişi qadağan etdi;* **3.** rədd etmək *(namizədi və s.)*; **to ~ a person** bir kəsin namizədliyini rədd etmək
**vex** [veks] *v* **1.** təngə/cana gətirmək, bezdirmək, zəhlə tökmək; acıqlandırmaq; hirslənmək; acığı tutmaq; *His conduct vexes me very much Onun davranışı məni təngə gətirir/əsəbiləşdirir/mənim ovqatımı təlx edir;* **to be/ to get ~ed at** *smth.* bir şeyə hirslənmək; **to be ~ed with** *smb.* bir kəsə hirslənmək/acığı tutmaq; **2.** cırnatmaq, özündən çıxartmaq; **to ~ with ridicule** rişxəndlə/masqara etməklə özündən çıxartmaq/cırnatmaq; **3.** *şair.* sonsuz olaraq müzakirə etmək *(məsələni)*; **4.** həyəcana/təlatümə gətirmək *(dalğanı)*; **5.** məyus/ dilxor etmək, əhvalı pozmaq, qüssələndirmək; əziyyət vermək; **to ~ one's mind with insoluble problems** həlli mümkün olmayan problemlərlə başını sındırmaq/beynini yormaq
**vexation** [vek'seıʃn] *n* **1.** pərtlik, dilxorçuluq; peşmançılıq; acıqlanma, əsəbiləşmə; qıcıqlanma; acıq, hirs; *Imagine my vexation Mənim dilxorçuluğumu /peşmançılığımı təsəvvür et/edin;* **2.** pislik; acılıq; **the little ~s of life** həyatın xırda pislikləri/acılıqları; **3.** *pl* sıxıntı, əziyyət, zülm; bəhanə, yersiz irad; **constant ~s on the part of the landlord** ev sahibinin aramsız bəhanələri/yersiz iradları
**vexatious** [vek'seıʃəs] *adj* **1.** kədərli, kədərləndirici, acı, təəssüflü, təəssüf ediləcək; *It's most vexatious to lose one's train Qatara gecikmək çox təəssüfləndiricidir;* **2.** həyəcanlı, iztirablı, narahat, zəhlətökən; **~ life** iztirablı/narahat həyat; **~ neghbour** zəhlətökən qonşu; **3.** ağır, yorucu, məşəqqətli; **~ tax** ağır/məşəqqətli vergi
**vexed** [vekst] *adj* **1.** mübahisəli, davalı, əngəlli, kəskin; **~ question** mübahisəli/kəskin məsələ; **~ point** mübahisəli bənd; **2.** dilxor, pərt, məyus; qıcıqlandırılmış
**via** [vaıə, vi:ə] *prep* ...-dan, ...-dən, ...vasitəsilə; **~ to London** Londondan; **from Moscow to London ~ Hamburg** Hamburq vasitəsilə Moskvadan Londona
**viable** ['vaıəbl] *adj* **1.** yaşamağa qabil/qadir, həyat qabiliyyəti olan; **~ child/foetus** yaşamağa qabil uşaq/döl; **~ state** yaşamaq qabiliyyəti olan dövlət; **2.** *k.t.* yaxşı cücərən/bitən *(toxum haq.)*
**vial** ['vaıəl] *n* **1.** şüşə, şüşə qab, flakon, ətir şüşəsi; **2.** sınaq borusu/şüşəsi, şüşə boru; ampula *(dərman saxlanılan qapalı kiçik şüşə qab)*
**vibrancy** ['vaıbrənsı] *n* vibrasiya; titrəyiş, titrəmə
**vibrant¹** ['vaıbrənt] *n fon.* cingiltili səs
**vibrant²** ['vaıbrənt] *adj* **1.** titrəyən; əsən; **~ with emotion/with passion** həyəcandan/ehtirasdan titrəyən/əsən; **2.** titrək *(səs haq.)*; **3.** canlı, səsli-küylü; **~ streets** canlı/səsli-küylü küçələr; **4.** *fon.* cingiltili
**vibrate** [vaı'breıt] *v* **1.** yellənmək, yırğalanmaq; *Palm trees vibrated in the breeze Palma ağacları mehdən yellənirdi;* **2.** *məc.* tərəddüd etmək, qətiyyətsizlik göstərmək; **to ~ between two opinions** iki fikir arasında tərəddüd etmək; **3.** **(with, in, to)** əsmək, titrəmək; **to ~ with joy** sevincdən əsmək/titrəmək; **4.** yelləmək, yırğalamaq; **5.** ölçmək; *A pendulum vibrates seconds Kəfkir (saatda) saniyələri ölçür;* **6. (in, on)** rezonans törətmək/yaratmaq
**vibrograph** ['vaıbrəgra:f] *n* vibroqraf *(titrəyişləri avtomatik yazan cihaz)*



**vibrometer** [vaı'brɔmıtə] *n* vibrometr *(maşınların, binaların, körpülərin və s. mexaniki titrəyişlərini ölçən cihaz)*
**vicarious** [vı'keərıəs; vaı'k-] *adj* **1.** əvəzedici, əvəz edən; vəkalətlə/tapşırıqla hərəkət edən; başqasının əvəzinə/ yerinə işləyən/fəaliyyət göstərən; **~ authority/power** bir kəsin vəkaləti ilə həyata keçirilən hakimiyyət; **~ agent** vəkil edilmiş şəxs; **~ ruler** canişin; **2.** başqasının rifahı üçün çalışan, başqasının yerinə əziyyət çəkən; **~ punishment** başqasının günahı ucbatından çəkilən cəza; **3.** *kil.* günahı yüngülləşdirən; **~ sacrifice** günahı yüngülləşdirən qurban
**vice¹** [vaıs] *n* I **1.** qüsur, nöqsan, eyib, çatışmazlıq; *Greed is vice Xəsislik qüsurdur/eyibdir;* **~s of style** üslubun qüsurları; **2.** kəhgirlik, harınlıq *(atda)*; sərtlik *(itdə)*; **3.** zəiflik, qüsur *(orqanizmdə)*
**vice** [vaıs] *n* II *tex.* məngənə; kəlbətin; qısqac; **carpenter ~** dülgər məngənəsi, vintli sıxac
**vice** [vaıs] *n* III *d.d.* **vice-president, vice-chancellor** *və s. bu qəbildən olan sözlərin qısa forması*
**vice²** [vaıs] *v tex.* məngənə ilə sıxmaq
**vice-admiral** [vaıs'ædmərəl] *n* vitse-admiral *(hərbi dəniz donanmasında yüksək rütbə)*
**vice-chairman** ['vaıs'tʃeəmən] *n (pl* **-men** [-mən]) sədr müavini
**vice-dean** ['vaısdi:n] *n* dekan müavini
**vice-president** ['vaıs'prezıdənt] *n* vitse-prezident, prezident müavini
**viceroy** ['vaısrɔı] *n* canişin, sərdar
**vice versa** ['vaıs'və:sə] *adv lat.* əksinə, tərsinə; *We helped them and vice versa Biz onlara kömək etdik və əksinə (yəni onlar da bizə kömək etdilər)*
**vicinal** ['vısınəl] *adj* **1.** qonşu; **2.** yerli, kəndarası; **~ way** kəndarası yol, yerli əhəmiyyət kəsb edən yol
**vicinity** [və'sınıtı] *n* **1.** qonşuluq, yaxınlıq; **~ to the capital** mərkəzlə qonşuluq, mərkəzə yaxınlıq; **in the ~ of** qonşuluqda; **in close ~ to** *smth.* bir şeyin bilavasitə yaxınlığında; **2.** dairə, rayon; ətraf yerlər, ətraf; *There is no library in the vicinity Bu ətraflarda kitabxana yoxdur;*
◊ **in the ~ of** təxminən, təqribən; *He is in the vicinity of sixty O təxminən altmış yaşındadır*
**vicious** ['vıʃəs] *adj* **1.** qüsurlu, eyibli; əxlaqsız, pozğun; **~ life** qüsurlu/pozğun həyat; **~ practices** əxlaqsızlıq, pozğunluq; **a ~ person** əxlaqsız/ pozğun adam; **2.** zərərli, ziyanlı, xətərli; **~ books** zərərli/xətərli kitablar; **3.** qəddar, zalım, acı, acıqlı, hirsli, kinli, qəzəbli; pis niyyətli; **~ look** kinli/qəzəbli baxış; **~ slander** pis niyyətli böhtan; **~ remark** acı irad; **~ rumour** pis niyyətli şayiə; **4.** pis, qüsurlu, yaramaz, çirkin; **~ style** pis/qüsurlu üslub; **~ mood** pis ovqat/əhval-ruhiyyə; **5.** *d.d.* dəhşətli, bərk, dözülməz; **~ headache** dəhşətli/ dözülməz baş ağrısı
◊ **~ circle** çıxılmaz vəziyyət, dolaşıqlıq
**viciousness** ['vıʃəsnıs] *n* **1.** qüsurluluq, nöqsanlılıq, eyiblilik; əxlaqsızlıq, pozğunluq, tərbiyəsizlik; **2.** hirs, acıq, kin, qəzəb, bədxahlıq, qərəz, qərəzkarlıq; **3.** yanlışlıq, səhv
**vicissitude** [vı'sısıtju:d; -tu:d] *n* **1.** dəyişkənlik, qərarsızlıq, səbatsızlıq; fanilik, dönüklük; **~ of life** həyatın faniliyi; **~s of fate** bəxtin/taleyin dönüklüyü; **2.** növbələşmə *(gecə və gündüzün, fəsillərin və s.)*; **the ~ of the seasons** fəsillərin növbələşməsi
**victim** ['vıktım] *n* qurban; **~s of war** müharibənin qurbanları; **to fall a ~ to** *smb./smth.* bir kəsin /şeyin qurbanı olmaq
**victimization, -isation** [.vıktımaı'zeıʃn] *n* **1.** yalan, aldatma, hiylə, fırıldaq, kələk; **2.** istehza, masqara, lağa qoyma, təhqir; cana/təngə gətirmə; **3.** qurban vermə
**victimize, -ise** ['vıktımaız] *v* **1.** əziyyət/əzab vermək, incitmək, üzmək; özündən çıxartmaq; **2.** aldatmaq; soymaq, talan etmək, var-yoxunu əlindən almaq; *He was victimized by swindlers Fırıldaqçılar onun var-yoxunu əlindən aldılar;* **3.** qurban vermək/kəsmək; **4.** təqib etmək; **5.** məhv etmək *(bitkini)*; kəsmək, qırmaq *(meşəni)*
**victor¹** ['vıktə] *n* qalib, qalib gələn, müzəffər
**victor²** ['vıktə] *adj* qalib, müzəffər; **~ troops** qalib/müzəffər qoşun/ordu; **a ~ country** qalib ölkə
**victorious** [vık'tɔ:rıəs] *adj* qalibiyyətli, müzəffər; yenilməz, basılmaz; **~ troops** yenilməz qoşun/ordu; **to be ~** qalib gəlmək/olmaq
**victoriously** [vık'tɔ:rıəslı] *adv* qalibiyyətlə, müzəffərcəsinə
**victory¹** ['vıktərı] *n* qələbə; **to declare ~** qələbəni bəyan/elan etmək; **to lead the team to ~** komandanı qələbəyə aparmaq; **to win the ~** qələbə çalmaq; qalib gəlmək; **to have the ~** qələbə qazanmaq; **to get the ~** qələbə qazanmaq/ əldə etmək; **~ in battle** döyüşdə/vuruşmada qələbə; **decisive ~** həlledici qələbə; **to win a decisive ~ in the election** seçkidə həlledici qələbə qazanmaq; **~ by fall** təmiz qələbə *(güləşdə)*; **~ on points** xal hesabı ilə qələbə
**victory²** ['vıktərı] *adj* qələbə; **~ parade** qələbə paradı; **Victory Day** qələbə günü; **~ processions** qələbə nümayişləri; **~ celebrations** qələbə bayramları
**video¹** ['vıdıou] *n (pl* **-os** [-ouz]) **1.** *d.d.* televiziya; video; **2.** təsvir, şəkil *(televiziyada)*
**video²** ['vıdıou] *adj* televiziya, televeziyaya aid olan; **~ signal** təsvir siqnalı *(televiziyada)*
**vie** [vaı] *v (pt, pp* **vied** [vaıd]) rəqabət aparmaq etmək, yarışmaq; **to ~ with** *smb.* **for** *smth.* bir kəslə bir şey üçün rəqabət aparmaq; **to ~ with one another for the first place/for power** bir-biri ilə birinci yer/hakimiyyət uğrunda yarışmaq/rəqabət aparmaq
**Viet-Namese, Vietnamese** [.vjetnə'mi:z] *n* vyetnamlı; **the ~** *top.i* vyetnamlılar

**view¹** [vju:] *n* **1.** görünüş, mənzərə; **a glorious ~** əzəmətli görünüş/mənzərə; **a superb ~ from the window** pəncərədən çox gözəl/möhtəşəm görünüş /mənzərə; **2.** mənzərə, görünüş *(şəkil, portret)*; **~s of Paris** Parisin mənzərələri; **3.** görünüş, zahiri cəhət, görünmə; **angle of ~** görünmə bucağı; **to be in ~** görünmək; *Not a person in view Heç kəs görünmür*; **in ~ of** ...görə, ...səbəbilə, ...nəzərə alaraq, ...üçün, -dan, -dən; **in ~ of *smb.*'s confession** bir kəsin etirafını nəzərə alaraq; **4.** məqsəd, məram, fikir; **in ~ 1)** məqsədilə; **with this in ~** bu məqsədlə/məramla; **2)** ümidlə;

◊ **to take short ~s** uzaqgörənlik nümayiş etdirməmək, gələcək haqqında düşünməmək; **to take the long ~** uzaqgörənlik göstərmək, gələcək haqqında düşünmək/fikirləşmək

**view²** [vju:] *v* **1.** baxmaq; **to ~ a house** evə baxmaq; **to ~ pictures** şəkillərə baxmaq; **2.** gözdən keçirmək; müzakirəyə qoymaq, müzakirə etmək; mühakimə yürütmək, qiymətləndirmək; *He views the matter in a different light O bu məsələni başqa cəhətdən qiymətləndirir*; **3.** baxmaq *(filmə, televiziyaya)*

**viewpoint** [ˈvju:pɔɪnt] *n* nöqteyi-nəzər, baxış

**vigil** [ˈvɪdʒɪl] *n* **1.** gecə növbətçiliyi/növbəsi; ayıq /oyaq qalma, yatmama; **to keep ~ over a sick child** xəstə uşağın yanında gecə növbəsi çəkmək/ gecəni oyaq qalmaq; **2.** *şair.* ayıqlıq, sayıqlıq; yuxusuz qalma

**vigilance** [ˈvɪdʒɪləns] *n* **1.** ayıqlıq, sayıqlıq, ehtiyatlılıq, diqqətlilik; **police ~** polis sayıqlığı; **2.** *tib.* yuxusuzluq

**vigilant** [ˈvɪdʒɪlənt] *adj* sayıq, ayıq, diqqətli; **to be ~ against *smth.*** bir şeyə qarşı diqqətli olmaq

**vigilantly** [ˈvɪdʒɪləntlɪ] *adv* sayıq, sayıqlıqla, ayıqsayıq

**vignette¹** [vɪnˈjet] *n* **1.** vinyetka *(kitabın və ya fəsillərin başında yaxud axırında verilən şəkil, naxış)*; **2.** kiçik hekayə; gözəl ədəbi eskiz

**vignette²** [vɪnˈjet] *v* vinyetka hazırlamaq/düzəltmək *(bax: **vignette¹**)*

**vigor** [ˈvɪgəʳ] *n amer.* = **vigour**

**vigorous** [ˈvɪgərəs] *adj* **1.** güclü, qüvvətli; gümrah, möhkəm; **a ~ root** güclü/möhkəm kök; **a ~ plant** gümrah bitki; **a ~ body** güclü/qüvvətli /gümrah bədən; *He is quite vigorous for his age O, yaşına görə xeyli gümrahdır*; **2.** canlı, təsirli; **a ~ debate** canlı müzakirə; **~ style** canlı/təsirli üslub; **3.** qətiyyətli *(hərəkət haq.)*; **~ measures/protest** qətiyyətli tədbirlər/etiraz

**vigour** [ˈvɪgəʳ] *n* **1.** güc, qüvvə, qüdrət; **to work with renewed ~** yeni güclə/qüvvə ilə işləmək; **2.** qətiyyət *(hərəkətdə və s.)*; **the ~ of his denial** onun rəddinin qətiyyəti; **3.** *hüq.* qanunilik, qanunauyğunluq; gerçəklik, həqiqət; qüvvədə olan; **laws still in ~** hələ də qüvvədə olan qanunlar

**viking** [ˈvaɪkɪŋ] *n tar.* vikinq **(1)** *qədim skandinav əsgəri;* **2)** *dəniz quldunu)*

**vile** [vaɪl] *adj* alçaq, əclaf, rəzil; xəbis, iyrənc, çox pis, mənfur; **a ~ smell** iyrənc/çox pis iy; **a ~ taste** çox pis/ iyrənc dad; **~ weather** iyrənc/çox pis hava; *Bribery is a vile practice Rüşvətxorluq çox pis/iyrənc işdir/ hərəkətdir*

**vilification** [ˌvɪlɪfɪˈkeɪʃn] *n* söyüş, söymə; çirkaba bulama; diffamasiya *(bir şəxsi ləkələyən məlumatın mətbuatda çap edilməsi)*

**vilifier** [ˈvɪlɪfaɪəʳ] *n* qarayaxa, söyən *(adam)*; böhtançı, iftiraçı, şərətan *(adam)*

**vilify** [ˈvɪlɪfaɪ] *v (pt, pp* **-fied**) söymək, abrını tökmək/almaq, yamanlamaq; ləkələmək, böhtan atmaq

**villa** [ˈvɪlə] *n* villa, imarət, ayrıca ev; **to live in a ~** villada yaşamaq; **to have a ~** villası olmaq

**village¹** [ˈvɪlɪdʒ] *n* kənd; **to live in the ~** kənddə yaşamaq

**village²** [ˈvɪlɪdʒ] *adj* kənd; **a ~ school/ church/ shop** kənd məktəbi/kilsəsi/dükanı

**villager** [ˈvɪlɪdʒəʳ] *n* kəndli, kənd əhli/sakini; *All the villagers took part in the ceremony Bütün kənd sakinləri mərasimdə iştirak etdilər*

**villain** [ˈvɪlən] *n* cani, cinayətkar; yaramaz, alçaq, əclaf; **desperate ~s** təhlükəli canilər/ cinayətkarlar; *The police caught the villains Polis cinayətkarları həbs etdi; The little villain has hidden my shoes Balaca yaramaz mənim ayaqqabımı gizlədib*

**villainous** [ˈvɪlənəs] *adj* **1.** alçaq, əclaf, rəzil *(hərəkət haq.)*; **2.** dəhşətli, qorxunc, müdhiş *(cinayət haq.)*; **3.** vəhşiyanə, vəhşicəsinə, qəddarcasına; **4.** çox pis, çirkin, iyrənc, mənfur; *The weather was villainous Hava çox pis/iyrənc idi*

**villainy** [ˈvɪlənɪ] *n* **1.** cinayət, cinayətkarlıq, canilik; vəhşilik, yırtıcılıq; **2.** ağır cinayət

**villein** [ˈvɪlɪn] *n tar.* təhkimli, təhkimli kəndli

**vim** [vɪm] *n d.d.* güc, qüvvə, qüvvət; enerji; **full of ~** çox fəal/ciddi; **to do *smth.* with ~** bir şeyi səylə etmək

**vindicate** [ˈvɪndɪkeɪt] *v* **1.** sübut etmək; təsdiq etmək; **to ~ *one's* veracity/*one's* courage** düzlüyünü/cəsarətini sübut etmək; **2.** müdafiə etmək, qorumaq; tərəfdar olmaq, kömək etmək; **to ~ *one's* honour/*one's* cause** öz şərəfini/işini müdafiə etmək; **to ~ *one's* claim to a privilege** bir şeydə imtiyazını qorumaq; **3.** bəraət vermək/ qazandırmaq; təmizə çıxartmaq; *I consider that I've been completely vindicated Mən hesab edirəm ki, mən tamamilə bəraət qazanmışam*

**vindication** [ˌvɪndɪˈkeɪʃn] *n* **1.** sübut, dəlil, təsdiq etmə; **2.** müdafiə, müdafiə etmə, kömək, kömək etmə; **3.** təmizə çıxartma, bəraət vermə, bəraət

**vindictive** [vɪnˈdɪktɪv] *adj* intiqamçı, kinli, kin



saxlayan; **a ~ person** intiqamçı/kin saxlayan adam

**vine** [vaɪn] *n* **1.** tənək, meynə; **2.** sarılan/sarmaşan bitki

**vine-dresser** [ˈvaɪnˌdresəʳ] *n* üzümçü, üzüm becərən /yetişdirən

**vinegar¹** [ˈvɪnɪgəʳ] *n* sirkə; **onions/cucumber pickled in ~** sirkəyə qoyulmuş soğan/ xiyar

**vinegar²** [ˈvɪnɪgəʳ] *v* **1.** sirkəyə/turşuya qoymaq; **2.** sirkə ilə sürtmək

**vinegary** [ˈvɪnɪgərɪ] *adj* sirkə, turş; **~ smell** sirkə iyi; *This wine tastes vinegary Bu şərab/çaxır sirkə dadır*

**vine-leaf** [ˈvaɪnli:f] *n (pl* **-leaves** [-li:vz]) tənək/ meynə yarpağı

**vineyard** [ˈvɪnjəd] *n* üzümlük, tənəklik, üzüm bağı

**vintage¹** [ˈvɪntɪdʒ] *n* **1.** üzüm yığımı/dərimi; **2.** müəyyən bir ilin məhsulu olan şərab/çaxır; **~ of 1999** 1999-cu ilin məhsulu olan şərab/çaxır; **3.** yüksək keyfiyyətli/əla şərab

**vintage²** [ˈvɪntɪdʒ] *adj* **1.** əla, köhnə; **~ wine** əla/köhnə şərab; **2.** köhnəlmiş, köhnə, dəbdən çıxmış; **~ suits** moddan/dəbdən çıxmış kostyumlar; **~ plays** köhnə/dəbdən düşmüş pyeslər; **~ cars** köhnə markalı avtomobillər

**vintage³** [ˈvɪntɪdʒ] *v* **1.** üzüm yığmaq/dərmək; **2.** üzüm şərabı/çaxırı düzəltmək

**vintager** [ˈvɪntɪdʒəʳ] *n* üzümyığan, üzümdərən

**vintaging** [ˈvɪntɪdʒɪŋ] *n* üzüm yığımı/dərimi

**vintner** [ˈvɪntnəʳ] *n* şərabsatan, çaxırsatan

**viola** [vɪˈoulə] *n mus.* alt *(skripkadan bir az böyük simli musiqi aləti)*

**violate** [ˈvaɪəleɪt] *v* **1.** təhqir etmək; **to ~ a tomb/a shrine/a church** qəbri/ziyarətgahı/kilsəni təhqir etmək; **2.** pozmaq; tapdalamaq; **to ~ calm** sakitliyi pozmaq; **to ~ the law** qanunu tapdalamaq/pozmaq; **3.** *id.* qaydanı pozmaq; **4.** məcbur etmək, güc işlətmək/tətbiq etmək; **5.** zorlamaq *(qızı, qadını)*

**violation** [ˌvaɪəˈleɪʃn] *n* **1.** təhqir, təhqir etmə, ləkələmə; **the ~ of a sacred place** müqəddəs yeri/ibadətgahı təhqir etmə; **2.** pozma *(müqavilə-ni və s.)*; **the ~ of a treaty** müqaviləni pozma; **a ~ of military discipline** hərbi qaydanı pozma; **~ of signals** hərəkət qaydasını pozma; **3.** *id.* qaydanı pozma; **4.** güc, zor, güc/zor işlətmə; **5.** zorlama *(qızı, qadını)*

**violator** [ˈvaɪəleɪtəʳ] *n* **1.** pozan *(qayda-qanunu)*; **2.** zorbazorluq edən, yırtıcı, zalım *(adam)*

**violence** [ˈvaɪələns] *n* **1.** güc, qüvvə; amansızlıq, hiddət, qəzəb, şiddət, azğınlıq, qudurğanlıq; **~ of passions/of emotions** şəhvətin/hissin azğınlığı; **the ~ of the wind and waves** küləyin və dalğaların azğınlığı; **to attack an enemy with ~** düşmənə amansızlıqla hücum etmək; **2.** zor, güc, zorlama, zorakılıq, məcburiyyət; **to use ~** zor/güc işlətmək; **3.** fiziki güc; döymə, xuliqan hərəkəti; **to handle *smb.* with ~** bir kəsə qarşı fiziki zor işlətmək *(döymək və s.)*; **4.** təhqir *(xüs. hərəkətlə edilən)*;

◊ **to do ~ to *smth.*** bir şeyi kobudcasına pozmaq *(qanunu və s.)*; **to do ~ to reason** ağlın/ düşüncənin əleyhinə getmək; təhqir etmək; **to do ~ to *smb.*'s feelings** bir kəsin hisslərini təhqir etmək; təhrif etmək, dəyişdirmək, saxtalaşdırmaq; korlamaq; **to do ~ to a text** mətni təhrif etmək/dəyişdirmək; **to do ~ to language** dili korlamaq; **to do ~ to truth** həqiqəti təhrif etmək

**violent** [ˈvaɪələnt] *adj* **1.** qəzəbli, qeyzli, hiddətli; coşğun, qudurğan; şiddətli, bərk; **~ passions** coşğun ehtiraslar; **~ abuse** hiddətli hücum; **~ controversy** şiddətli mübahisə; **2.** bərk, azğın, kəskin, şiddətli; **~ storm /wind/ earthquake** bərk tufan/külək/zəlzələ; **~ revulsion** şiddətli ikrah; **~ pain** bərk/şiddətli ağrı; **3.** zorakı; **~ death** zorakı ölüm; **4.** ehtiraslı, qızğın; **~ speech** ehtiraslı/qızğın nitq; **5.** çılğın; **a ~ man** çılğın adam

**violet¹** [ˈvaɪəlɪt] *n* **1.** *bot.* bənövşə; **2.** bənövşəyi rəng

**violet²** [ˈvaɪəlɪt] *adj* bənövşə; bənövşəyi; **~ smell** bənövşə iyi; **~ eyes** bənövşəyi gözlər

**violin** [ˌvaɪəˈlɪn] *n* skripka; **to play the/on a ~** skripka çalmaq; **to teach the~** skripka çalmağı öyrətmək;

◊ **to play first ~** aparıcı/əsas rol oynamaq, aparıcı vəziyyətdə olmaq

**violinist** [ˈvaɪəlɪnɪst] *n* skripkaçı, skripka çalan

**violin-maker** [ˌvaɪəˈlɪnˌmeɪkəʳ] *n* skripka ustası, skripka qayıran usta

**violoncellist** [ˌvaɪələnˈtʃelɪst] *n* violonçelist, violonçel çalan

**violoncello** [ˌvaɪələnˈtʃelou] *n mus.* *(pl* **-os** [-ouz]) violonçel

**viper** [ˈvaɪpəʳ] *n* **1.** *zool.* gürzə *(ilan)*; **2.** *məc.* ilan, gürzə, zəhər tuluğu, acıdil, ətiacı *(adam)*

**virago** [vɪˈra:gou] *n (pl* **-os, -oes** [-ouz]) deyingən kobud qadın, ifritə, yolagetməz, acıdil *(qadın)*

**virgin¹** [ˈvə:dʒɪn] *n* qız, bakirə qız

**virgin²** [ˈvə:dʒɪn] *adj* **1.** bakir; əl dəyməmiş; **2.** toxunulmamış, təmiz, xam; **~ snow** təmiz/toxunulmamış qar; **~ forest** xam/baltadəyməmiş meşə; **~ soil/land** xam torpaq

**virginhood** [ˈvə:dʒɪnhud] *n* bakirəlik, bakirlik, bəkarət

**virginity** [və:ˈdʒɪnɪtɪ] *n* **1.** qızlıq, bakirəlik; **to keep *one's* ~** qızlığını/bakirəliyini saxlamaq; **to lose *one's* ~** qızlığını/bakirəliyini itirmək; **2.** qızlıq dövrü/zamanı

**virile** [ˈvɪraɪl] *adj* **1.** kişi; **~ strength** kişi gücü/qüvvəsi; **~ courage** kişi cəsarəti/igidliyi; **~ member** kişi tənasül orqanı; **2.** kişiləşmiş, yetişmiş, cinsi əlaqə yaşına çatmış; cinsi əlaqəyə girmək bacarığı olan; **3.** cəsarətli, qoçaq,

igid, mərd; qüvvətli, güclü; ~ **character** güclü xarakter

**virility** [vɪ'rɪlɪtɪ] *n* **1.** kişilik, cinsi əlaqəyə girmə bacarığı *(kişilərdə)*; cinsi əlaqə imkanı /qabiliyyəti; **2.** cəsarət, igidlik, mətanət, güc, enerji; **political** ~ siyasi cəsarət; **economic** ~ iqtisadi güc/qüvvə

**virology** [vaɪə'rɔlədʒɪ] *n* virusologiya *(viruslarla məşğul olan elm sahəsi)*

**virtual** ['vɜ:tʃuəl] *adj* **1.** faktiki, həqiqi, gerçək, fakta əsaslanan; **the ~ manager of a business** müəssisənin həqiqi/faktiki rəhbəri/meneceri; ~ **rulers of a country** ölkənin həqiqi başçıları/hakimləri; **2.** mümkün, mümkün olan; güman edilən; ~ **length** güman edilən uzunluq *(yol və s. haq.)*; ~ **velocity** *fiz.* mümkün/ mümkün olan sürət; **3.** xəyali, əsli olmayan; ~ **image** xəyali təsvir/imic

**virtuality** [ˌvɜ:tʃu'ælɪtɪ] *n* **1.** mahiyyət, məğz, mətləb; məna; **2.** mümkünlük, ehtimal; fürsət, imkan

**virtually** ['vɜ:tʃuəlɪ] *adv* həqiqətən, həqiqətdə, əslində, əslinə baxdıqda, mahiyyətcə; ~ **powerless** həqiqi hakimiyyəti/ixtiyarı olmayan; *The request was virtually a command Bu xahiş əslində/mahiyyətcə əmr idi*

**virtue** ['vɜ:tʃu:] *n* **1.** comərdlik, yaxşılıq, ləyaqət, məziyyət; **2.** əxlaq, ədəb qaydaları; ~ **and vice** xeyirxahlıq və nöqsan; **the path of ~** xeyirxahlıq yolu; **to entice *smb.* from the path of ~** bir kəsi xeyirxahlıq yolundan sapdırmaq/ çəkindirmək, bir kəsi tamahlandırmaq / pis yola çəkmək; **to follow ~** xeyirxah yaşamaq; **to win *smb.* to ~** bir kəsi doğru yola/ ədəb qaydalarına qaytarmaq; **3.** əxlaq, ismət, təmizlik, bəkarət; **a woman of ~** əxlaqlı/ismətli qadın; **a woman of easy ~** əxlaqsız/pozğun qadın; **4.** yaxşı keyfiyyət, müsbət xüsusiyyət/cəhət; ləyaqət, məziyyət, üstünlük; **~s and shortcomings** məziyyətlər və çatışmazlıqlar; *Natural virtues are justice, prudence, temperance and fortitude fəls. Təbii məziyyətlər ədalət, ehtiyatlılıq, sadəlik və cəsarətdir*; **5.** güc; təsir; **the ~ of a medicine** dərmanın təsiri; *There is no virtue in such medicine Belə dərmanların heç bir təsiri/ gücü yoxdur; I have no faith in the virtue of herbs to heal sickness Mən otların xəstəliyi müalicə etmə gücünə inanmıram*;

◊ **in/by ~ of** vasitəsilə, əsasında; **by ~ of agreement** müqavilənin gücü ilə; **to succeed by ~ of *one's* authority/of *one's* influence** öz nüfuzu ilə/təsiri ilə müvəffəqiyyət qazanmaq

**virtued** ['vɜ:tʃu:d] *adj* **1.** xeyirxah, səxavətli, comərd; **2.** güclü, qüvvətli, təsirli

**virtueless** ['vɜ:tʃu:lɪs] *adj* **1.** təsirsiz, faydasız *(dərman və s. haq.)*; **2.** əxlaqsız, pozğun

**virtous** ['vɜ:tʃuəs] *adj* **1.** xeyirxah, səxavətli, comərd, yaxşı; *A virtuous wife is a crown to her husband (Bibliya) Xeyirxah/Yaxşı/Səxavətli arvad kişinin başının tacıdır*; **2.** əxlaqlı, ismətli, təmiz *(qadın haq.)*; **3.** güclü, təsirli, effektli; ~ **herbs** müalicə otları; **4.** sehrli, ovsunlu; ecazkar; sehrli gücə malik olan; **the ~ glass** sehrli güzgü

**virtuosity** [ˌvɜ:tʃu'ɔsɪtɪ] *n* **1.** virtuozluq, böyük ustalıq/sənətkarlıq; **2.** incəsənətə məhəbbət

**virulence** ['vɪrələns] *n* **1.** zəhərlilik, zəhərin gücü; **2.** hirs, acıq, kin, qəzəb, ədavət, qərəz; **to attack *smb.* with ~** bir kəsə qəzəblə hücuma keçmək

**virulent** ['vɪrələnt] *adj* **1.** təhlükəli, qorxulu, xətərli *(xəstəlik və s. haq.)*; **2.** öldürücü, ölümcül, məhvedici; ~ **poison** öldürücü/məhvedici zəhər; **3.** hirsli, acıqlı, qəzəbli, kinli; ~ **abuse** qəzəbli/hirsli hücum; ~ **tongues** dedi-qoduçular, söz gəzdirənlər, böhtançılar; **4.** *tib.* yoluxucu *(xəstəlik haq.)*

**virus**[1] ['vaɪərəs] *n tib.* virus *(yoluxucu xəstəlik törədən mikrob)*; **the flu ~** qrip virusu; **to transmit a ~** virus keçirmək

**virus**[2] ['vaɪərəs] *adj* **1.** virus; ~ **disease** virus xəstəliyi; **2.** virus *(kompyuterdə)*

**visa** ['vi:zə] *n dip.* viza; **entry/exit ~** daxil olma/ getmə vizası; **to apply for a ~** viza almaq üçün müraciət etmək; **to grant a ~** viza vermək

**visage** ['vɪzɪdʒ] *n* **1.** sifət, sifətin ifadəsi; **2.** üz, görünən tərəf *(ayın)*

**vis-a-vis**[1] ['vi:za:'vi:] *n (cəmdə dəyişmir) fr.* vizavi *(üzbəüz oturan şəxs)*

**vis-a-vis**[2] ['vi:za:'vi:] *adv* üz-üzə, qarşı-qarşıya; **to sit ~** üz-üzə/qarşı-qarşıya oturmaq

**vis-a-vis**[3] ['vi:za:'vi:] *prep* **1.** üz-üzə, qarşı-qarşıya; **2.** ...müqayisədə; **USA policy ~ France** Fransa ilə müqayisədə ABŞ-ın siyasəti; **3.** qarşısında; **to be responsible ~ *smb*,** bir kəsin qarşısında məsuliyyət daşımaq

**viscera** ['vɪsərə] *n pl* **1.** içalat, iç; **2.** *anat.* daxili orqanlar

**visceral** ['vɪsərəl] *adj anat.* daxili orqanlara aid olan; ~ **cavity** gövdə boşluğu

**viscose** ['vɪskous] *n toxuc.* viskoz *(süni ipək)*; *This material is 50% viscose Bu parça 50% viskozdur*

**viscount** ['vɪskaunt] *n* **1.** vikont *(Fransada və İngiltərədə zadəgan rütbəsi)*; **2.** *tar.* qraf valisi

**visibility** [ˌvɪzɪ'bɪlɪtɪ] *n* görünmə dairəsi, görünmə, görünüş sahəsi; **poor ~** pis/zəif görünüş sahəsi/ dairəsi

**visible** ['vɪzəbl] *adj* **1.** görünən, gözlə görünə bilən; ~ **to the naked eye** adi gözlə görünə bilən; *This star is not visible to the naked eye Bu ulduz adi gözlə görünmür*; ~ **by the help of a telescope** teleskop vasitəsilə görünə bilən; *The house was visible in the distance Ev uzaqdan görünürdü*; **2.** aydın, açıq-aydın; *He spoke with visible impatience O, açıq-aydın hövsələsiz danışdı*

**visibleness** ['vɪzəblnɪs] *n* **1.** iti görmə, itigözlülük; görünmə; **2.** aşkarlıq, aydınlıq, şübhəsizlik



**visibly** ['vɪzəblɪ] *adv* açıq, açıqcasına, açıq-aydın, açıqdan-açığa; şübhəsiz; *He was visibly annoyed O açıq-aydın əsəbiləşmişdi*

**vision** ['vɪʒn] *n* **1.** görmə; *The organ of vision is the eye Görmə orqanı gözdür*; **glasses for far/for close ~** uzağı/yaxını görmə üçün eynək; **2.** qabağı/ gələcəyi görmə; fərasət, bəsarət, gözüaçıqlıq; **a man of ~** uzaqgörən adam; **3.** arzu, istək; **~s of power/of wealth/of fame** qüdrət/var-dövlət/şöhrət arzusu; **4.** təxəyyül; **the ~ of a poet** şairin təxəyyülü; **5.** təsəvvür; **the ~ of the world** dünya haqqında təsəvvür, dünyagörüşü, dünya baxışı; **a ~ of the future** gələcək haqqında təsəvvür

**visionary**[1] ['vɪʒənrɪ] *n* **1.** xəyalçı, xəyalpərəst *(adam)*; **2.** mistik, sufi

**visionary**[2] ['vɪʒənrɪ] *adj* **1.** xəyali, göz qabağına gətirilən; təsəvvür edilən; fantastik, uydurma, qeyri-real; ~ **world** xəyali/uydurma dünya; ~ **form** kabus, kölgə, qarabasma; ~ **happiness** təsəvvür edilən/qeyri-real xoşbəxtlik; **2.** sərfəsiz, həyata keçirilməsi mümkün olmayan, həyata keçirilə bilməyən, icrası mümkün olmayan; ~ **schemes** həyata keçirilməsi mümkün olmayan planlar

**visit**[1] ['vɪzɪt] *n* **1.** vizit, səfər; yoluxma; **social ~** dostluq səfəri; **courtesy ~** *dip.* qeyri-rəsmi görüş; **to return a ~** cavab görüşünə gəlmək/getmək; **mutual/reciprocal ~s** *dip.* qarşılıqlı vizitlər/ görüşlər; **goodwill ~** *dip.* xoşməramlı görüş/vizit; **to make/to pay a ~** baş çəkmək, görüşə gəlmək; **to make a ~ to a neighbour** qonşuya baş çəkmək, qonşuya getmək; **to make a ~ to a patient** xəstəyə baş çəkmək, xəstənin yanına getmək; **to pay a ~ to the President** prezidentin görüşünə getmək, prezidentlə görüşmək; **to receive/to have a ~ from *smb.*** bir kəsi qəbul etmək; **to go out on a ~** qonaq getmək; *The President received a visit from the Ambassador Prezident səfiri qəbul etdi*; **2.** getmə; **a ~ to a museum/to a theatre** muzeyə/ teatra getmə; **3.** qısamüddətli qonaq olma/ qalma/yaşama; *I don't live here. I am only on a visit Mən burada yaşamıram, ancaq bura qısa müddətə gəlmişəm/burada qısamüddətli qonağam*

**visit**[2] ['vɪzɪt] *v* **1.** baş çəkmək, qonaq gəlmək; **to ~ a neighbour/an old friend/a sick person** qonşuya/ əski dosta/xəstə adama baş çəkmək; *Doctors visit their patients every morning Həkimlər hər səhər xəstələrinə baş çəkirlər*; **2.** getmək; *I want to visit Istanbul Mən İstanbula getmək istəyirəm*; **to ~ foreign countries** xarici ölkələrə getmək; **3.** *amer.* **(to ~ with/in/at)** qonaq olmaq/qalmaq; *I'll visit with my uncle tomorrow Sabah mən dayımın qonağı olacam*; **to ~ in the country** kənddə qonaq olmaq; **to ~ at a new hotel** təzə mehmanxanaya düşmək/ mehmanxanada qalmaq; **4.** *hüq.* yoxlamaq, nəzərdən keçirmək; **to ~ the scene of a crime** cinayət yerini yoxlamaq

**visitation** [ˌvɪzɪ'teɪʃn] *n* **1.** baş çəkmə, getmə, gəlmə; yoxlama; ~ **of the sick** xəstəni evdə yoxlamaq; **2.** rəsmi vizit; **3.** *hüq.* yoxlama, axtarış

**visitor** ['vɪzɪtə'] *n* **1.** gələn *(görüşə, tamaşaya və s.)*, qonaq; **official ~** rəsmi qonaq; *We have visitors Bizim qonaqlarımız var*; **~s to a museum** muzeyə gələnlər; **2.** müvəqqəti sakin; **summer ~s** yayda bağ evində yaşayanlar; **~s to a hotel** mehmanxanada yaşayanlar;

◊ **~s' book 1)** gələnlərin qeydiyyat kitabı; **2)** qeyd dəftəri *(mehmanxanada)*

**visor** ['vaɪzə'] *n* **1.** günlük *(şapka qabaqlığı)*; **2.** *tex.* sipər *(səngərdə, dəbilqədə)*

**vista** ['vɪstə] *n* **1.** görünüş, mənzərə; **2.** xiyaban, alleya; **a long ~ of beech-trees** uzun fıstıq ağacı xiyabanı/ alleyası; **3.** qatar, cərgə, sıra *(xatirələrin və s.)*; **~s of memory** xatirələr qatarı; **4.** imkanlar, ümidlər, perspektiv; **to open up new ~s** yeni imkanlar açmaq

**visual**[1] ['vɪʒuəl] *n* **1.** görmə yaddaşı yaxşı olan adam; **2.** *pl* şəkil, surət, təsvir *(kinoda)*

**visual**[2] ['vɪʒuəl] *adj* **1.** görmə; ~ **nerve** *anat.* görmə siniri; ~ **perception/sensations** görmə qavrayışı/ duyğusu; ~ **organ** görmə orqanı; **2.** vizual, görünən; ~ **observation** vizual müşahidə; ~ **reconnaissance** *hərb.* vizual kəşfiyyat; **3.** əyani; ~ **aids** əyani vasitələr; **4.** optik; ~ **angle** optik bucaq

**visualization, -isation** [ˌvɪʒuəlaɪ'zeɪʃn] *n* **1.** surət, şəkil; təsəvvür etmə *(fikrən)*; ~ **of the future** gələcəyi təsəvvür etmə, gələcək haqqında təsəvvür; **2.** əyanilik, canlılıq, mücəssəmə, təmsil olunma, təcəssüm etmə; **3.** hiss olunma, gözə çarpma

**visualize, -ise** ['vɪʒuəlaɪz] *v* **1.** fikrən təsəvvür etmək; **2.** görünəcək/hiss ediləcək şəklə salmaq

**vital** ['vaɪtl] *adj* **1.** həyat, həyati; ~ **force** həyat gücü; ~ **principles** həyati prinsiplər; **2.** vacib, əsas; ~ **organs** *anat.* həyat üçün vacib/əsas olan orqanlar; *He received several bullet wound but was not hit in any of the vital organs O, bir neçə güllə yarası aldı, lakin həyat üçün vacib olan orqanların heç biri zədələnmədi*; **3.** ən mühüm/vacib/zəruri; ~ **interests** ən vacib maraqlar; ~ **question** ən mühüm/zəruri məsələ; **4.** çalışqan, səyli, diri, canlı; çevik, diribaş, qıvraq; ~ **personality** çalışqan/ zirək/diribaş adam; ~ **style** canlı üslub; **5.** öldürücü, ölümcül; ~ **wound** ölümcül yara;

◊ ~ **error** çox pis/faciəli səhv

**vitality** [vaɪ'tælɪtɪ] *n* **1.** həyatilik, həyat/yaşamaq qabiliyyəti; ~ **of seeds** toxumların yaşamaq qabiliyyəti; *An artificial language has no vitality Süni dilin yaşamaq qabiliyyəti olmur. Süni dil uzun yaşamır*; **2.** enerji, güc, qüvvə; **intense ~**

qaynar enerji; **full of ~** enerjili, çevik, diribaş *(adam)*

**vitamin[1]** [ˈvɪtəmɪn; vaɪt-] *n* vitamin; *Orange is rich in vitamin C Portağal C vitamini ilə zəngindir*

**vitamin[2]** [ˈvɪtəmɪn; vaɪt-] *adj* vitamin; **~ deficiency** vitamin çatışmazlığı; **~ pills** vitamin həbləri

**vitiate** [ˈvɪʃɪeɪt] *v* **1.** korlamaq, təhrif/xarab etmək; **to ~ the style** üslubu korlamaq; **to ~ literary works** ədəbi əsərləri təhrif etmək; **2.** əxlaqını pozmaq, yoldan çıxartmaq, pis yola çəkmək; mənəviyyatını pozmaq/ korlamaq; **3.** *hüq.* hüquqi gücdən salmaq; saxtalaşdırmaq; **to ~ a will/a contract** vəsiyyəti/sazişi saxtalaşdırmaq

**vitiated** [ˈvɪʃɪeɪtɪd] *adj* **1.** xarab edilmiş/olmuş, korlanmış; **~ air** korlanmış hava; **2.** *hüq.* qanuni gücünü itirmiş

**vitiation** [ˌvɪʃɪˈeɪʃn] *n* **1.** korlama, korlanma, xarab etmə/olma; təhrif, təhrif etmə/edilmə; **2.** əxlaqını pozma, yoldan çıxartma, pis yola çəkmə; **3.** *hüq.* hüquqi gücdən salma, saxta hesab edilmə

**viticide** [ˈvɪtɪsaɪd] *n k.t.* üzüm tənəyinin ziyanvericisi

**viticulture** [ˈvɪtɪkʌltʃəʳ] *n* üzümçülük

**viticulturer** [ˈvɪtɪkʌltʃərəʳ] *n* üzümçü, üzüm yetişdirən adam

**vitreous** [ˈvɪtrɪəs] *adj* **1.** şüşə; **2.** şüşəyəbənzər, şüşəyəoxşar; **~ body** şüşəyəbənzər cisim

**vitrification** [ˌvɪtrɪfɪˈkeɪʃn] *n* **1.** şüşəyə çevirmə; şüşələşdirmə; **2.** şüşəyəoxşar/şüşəvarı maddə

**vitrify** [ˈvɪtrɪfaɪ] *v (pt, pp* **-fied)** şüşəyə və ya şüşəvarı maddəyə çevirmək/çevrilmək

**vitroil** [ˈvɪtrɪəl] *n* **1.** *kim.* kuporos *(ağır metalların sulfat duzu)*; **blue/green ~** mis/dəmir kuporosu; **2.** zəhər; zəhərli istehza/kinayə

**viva[1]** [vaɪvə] *n d.d.* şifahi imtahan; *I've finished my written exams but still I have to do a viva Mən yazılı imtahanlarımı qurtarmışam, lakin hələ bir şifahi imtahan verməliyəm*

**viva[2]** [vaɪvə] *v* **1.** *d.d.* şifahi imtahan vermək; **2.** şifahi imtahan götürmək

**vivacious** [vɪˈveɪʃəs] *adj* sağlam, gümrah; şən, şad, gülərüzlü

**viva-voce[1]** [ˈvaɪvəˈvous] *n* şifahi imtahan

**viva-voce[2]** [ˈvaɪvəˈvous] *adj* şifahi; **~ examination** şifahi imtahan

**viva-voce[3]** [ˈvaɪvəˈvous] *v* şifahi imtahan götürmək

**viva-voce[4]** [ˈvaɪvəˈvous] *adv* ucadan, hündürdən; **to speak ~** ucadan danışmaq

**vivid** [ˈvɪvɪd] *adj* **1.** parlaq; **~ colouring** parlaq rəng; **a ~ flash of lightning** şimşəyin parlaq işığı; **2.** canlı; qızğın; çevik; **~ imagination** canlı təsəvvür; **~ interest** qızğın maraq; **~ personality** çevik şəxsiyyət; **3.** aydın, dəqiq; **a ~ reflection in the water** suda aydın əks; *He gave a vivid description of the problem O, problemin dəqiq təsvirini verdi*

**vividity** [vɪˈvɪdɪtɪ] *n* **1.** parlaqlıq; **2.** aydınlıq, dəqiqlik; **the ~ of the dream** yuxunun aydınlığı

**vividly** [ˈvɪvɪdlɪ] *adv* **1.** parlaq, parlaq surətdə; **2.** aydın, açıq, aydın/açıq surətdə, açıq- aydın

**vividness** [ˈvɪvɪdnɪs] *n* = **vividity**

**vivify** [ˈvɪvɪfaɪ] *v (pt, pp* **-fied) 1.** həyata keçirmək; təzələmək, bərpa etmək; **2.** dirçəltmək, həyat vermək; **3.** parlaqlıq vermək; **4.** diriltmək; canlandırmaq; dirilmək

**vivisection** [ˌvɪvɪˈsekʃn] *n tib.* viviseksiya *(elmi məqsəd üçün heyvanların yarılması)*

**vixen** [ˈvɪksn] *n* **1.** tülkü *(dişi)*; **2.** ifritə, deyingən qadın

**vocabulary** [vəˈkæbjələrɪ] *n* **1.** lüğət; sözlük; **2.** lüğət tərkibi *(dilin)*; leksika; **3.** lüğət ehtiyatı; **passive ~** passiv lüğət ehtiyatı; **a wide/limited/rich ~** geniş/məhdud/zəngin lüğət ehtiyatı

**vocal[1]** [ˈvoukl] *n fon.* sait/cingiltili səs

**vocal[2]** [ˈvoukl] *adj* **1.** nitq; **~ organs** nitq üzvləri; **~ cord/band** *anat.* səs teli; **2.** şifahi; **~ communication** şifahi məlumat; **3.** danışan, natiqlik qabiliyyətinə malik olan; **4.** bərk, uca, gur, gurultulu *(səs haq.)*; çığırqan, qışqırıqçı, çığır-bağır salan; **~ persons** qışqırıqçı/çığır-bağır salan adamlar; **5.** *mus.* vokal; oxumaq üçün yazılmış; **~ music** vokal musiqi; **6.** *fon.* sait, cingiltili

**vocalism** [ˌvoukəˈlɪzm] *n dilç.* vokalizm *(dildə sait səslər sistemi)*

**vocalist** [ˈvoukəlɪst] *n* vokalist, müğənni, xanəndə, oxuyan

**vocalization, -isation** [ˌvoukəˈlaɪzeɪʃn] *n fon.* vokalizasiya *(samit səsin sait səsə keçməsi)*

**vocalize, -ise** [ˈvoukəlaɪz] *v* **1.** səs çıxartmaq, səslə ifadə etmək, nitqlə ifadə etmək; tələffüz etmək *(sözü)*; **2.** oxumaq *(mahnı)*; **3.** *fon.* cingiltiləşdirmək, ucadan/cingilti ilə tələffüz etmək

**vocally** [voukəlɪ] *adv* **1.** şifahi; **2.** bərkdən, ucadan, gur səslə; səs-küylə

**vocation** [vouˈkeɪʃn] *n* **1. (for, to)** həvəs, meyl; qabiliyyət, istedad; **~ for teaching** müəllimliyə qabiliyyət; **no ~ to music/literature** musiqiyə/ədəbiyyata heç bir qabiliyyəti olmama; **2.** sənət, peşə; **mechanical ~** texniki sənət /peşə; **to change *one's* ~** sənətini/peşəsini dəyişmək; **to choose medicine as *one's* ~** tibbi/təbabəti özünə peşə seçmək

**vocational** [vouˈkeɪʃnl] *adj* peşə, sənət; **~ training/ education** sənət/peşə təlimi, ixtisas hazırlığı; **~ school** peşə/sənət məktəbi

**vocationally** [vouˈkeɪʃnəlɪ] *adv* sənət/peşə baxımından

**vocative[1]** [ˈvɔkətɪv] *n* **1.** *qram.* çağırış halı; **2.** müraciət forması

**vocative[2]** [ˈvɔkətɪv] *adj* çağırış; **~ case** çağırış halı

**voces** [ˈvousi:z] *n* **vox** *isminin cəm forması*

**vociferous** [vəˈsɪfərəs] *adj* **1.** uca, gur, gurultulu, səs-küylü; **~ protest/complain/demand** gurultulu/ səs-küylü etiraz /şikayət/tələb; **2.** gursəsli, gur səsi olan; çığırqan, qışqırıqçı, çığır-bağır salan; *The audience became vociferous İştirakçılar qışqırmağa /çığır-bağır salmağa başladı*; **~ crowd** qışqırıqçı/çığır-bağır salan kütlə/ camaat



**vodka** [ˈvɔdkə] *n* araq; **to drink ~** araq içmək

**vogue** [voug] *n* **1.** moda, dəb; **to be in ~** modda/ dəbdə olmaq; *Black suit is in vogue again Qara kostyum yenidən dəbdədir*; **to become back into ~** yenidən dəbə/moda düşmək; *Short hair has come back into vogue Qısa saç yenidən moda/ dəbə düşüb*; **2.** məşhurluq, şöhrət, hamı tərəfindən tanınma; **to have a good deal of ~ as a painter** rəssam kimi çox məşhur olmaq; *War novels had a great vogue a few years ago Cəmi bir neçə il bundan qabaq müharibədən bəhs edən romanlara tələb çox idi*

**voice[1]** [vɔɪs] *n* **1.** səs; **rough/sweet/thin ~** kobud/şirin/nazik səs; **in a gentle ~** incə səslə; **in a loud ~** uca səslə; **to lift up *one's* ~** səsini yüksəltmək; **to raise *one's* ~** səsini qaldırmaq; **~ of conscience** vicdanın səsi; **to be out of ~** səsi batmaq; *I suddenly heard a voice Mən qəflətən bir səs eşitdim*; **2.** *din.* **the ~ of God** Allahın səsi; **3.** səda, şırıltı; gurultu; **the ~ of the stream** çayın şırıltısı; **the ~ of the waves/of the sea/of the storm** dalğaların/dənizin/tufanın gurultusu; **4.** fikir, rəy; **to have a ~ in *smth.*** bir şey haqqında fikri/rəyi olmaq; **5.** *qram.* növ; **active/passive ~** məlum/məchul növ;

◊ **the ~ of Nature** təbiətin səsi/çağırışı; **with one ~** bir səslə, bir nəfər kimi; *They cried out all with one voice Onlar hamısı bir səslə qışqırdılar*

**voice[2]** [vɔɪs] *v* **1.** ifadə etmək *(sözlə)*, demək, söyləmək; **to ~ *one's* protest/*one's* desire /*one's* hope** narazılığını / arzusunu/ümidini ifadə etmək; *The spokesman voiced the worker's dissatisfaction Natiq fəhlələrin narazılıqlarını söylədi*; **2.** *fon.* səs tələffüz etmək

**voiced** [vɔɪst] *adj fon.* cingiltili; **~ consonants** cingiltili samitlər

**-voiced** [-vɔɪst] *mürəkkəb sifətlərin komponenti: Azərbaycan türkcəsində mürəkkəb sifətlərdə -səsli komponentinə uyğun gəlir:* loud-voiced ucasəsli, gursəsli; sweet-voiced şirinsəsli, xoşsəsli

**voiceful** [ˈvɔɪsfl] *adj* **1.** səsli, gursəsli, ucasəsli; səsli-küylü; **~ sea** səsli-küylü dəniz; **2. (with)** səsə aid olan, səs

**voiceless** [ˈvɔɪslɪs] *adj* **1.** səssiz, səsi olmayan *(müğənni haq.)*; **2.** lal; **3.** *fon.* kar; **~ consonants** kar samitlər

**voicelessness** [ˈvɔɪslɪsnɪs] *n* **1.** səssizlik, dinməzlik; **2.** karlıq; **3.** səsi olmama *(müğənni haq.)*; **4.** *fon.* karlıq *(samit haq.)*

**void[1]** [vɔɪd] *n* **1. (the ~)** boşluq; vakuum; *Who will fill the political void created by his death? Onun ölümünün yaratdığı siyasi boşluğu kim dolduracaq?* **2.** boş yer, ara, aralıq; **to fill the ~** boş yeri doldurmaq

**void[2]** [vɔɪd] *adj* **1.** boş; **~ space** boş səma; **~ interval** interval, boş yer; **2.** tutulmamış; **to fall ~** azad olmaq, boş qalmaq *(vəzifə haq.)*; **3. (of)** məhrum, məhrum edilmiş; -sız, -siz, -suz, -süz; **~ of reason/of sense** mənasız, məqsədsiz; **4.** faydasız, ziyansız, zərərsiz; **5.** *hüq.* qanuni qüvvəsi olmayan, qanuni qüvvəsini itirmiş, etibarsız, təsirsiz, təsiri olmayan; **~ contract** qanuni qüvvəsini itirmiş müqavilə/kontrakt; **to consider (null and) ~** qanuni qüvvəsini itirmiş hesab etmək

**void[3]** [vɔɪd] *v* **1.** *fiziol.* çölə/bayıra çıxmaq; boşaltmaq *(bağırsaqları, sidik kisəsini)*; **2.** *hüq.* ləğv etmək; **3.** *məc.* yoxa çıxartmaq, məhv etmək

**voile** [vɔɪl] *n toxuc.* tor, nazik parça

**volcanic** [vɔlˈkænɪk] *adj* vulkan, vulkanik; vulkanın yaratdığı; **~ eruption** vulkan püskürməsi, vurkanik püskürmə; **~ rocks** vulkan süxurları; **~ gases** vulkan qazları; **a ~ island** vulkanın yaratdığı /vulkanik ada; **~ activity** vulkanik aktivlik

**volcano** [vɔlˈkeɪnou] *n (pl* **-es)** vulkan; **active/ extinct ~** aktiv/sönmüş vulkan

**volcanology** [ˌvɔlkəˈnɔlədʒɪ] *n* vulkanologiya *(vulkanları öyrənən elm sahəsi)*

**vole** [voul] *n zool.* taxıl/çöl siçanı

**volition** [vəˈlɪʃn; vou-] *n* **1.** arzu, istək, ixtiyar; **of his own ~** öz arzusu/istəyi ilə; **2.** iradə

**volitional** [vouˈlɪʃnəl] *adj* iradə, iradəli; **a ~ person** iradəli adam

**volley[1]** [ˈvɔlɪ] *n* **1.** yaylım atəşi; **to fire/to discharge a ~** yaylım atəşi açmaq; **2.** *şair.* leysan, güclü/ şiddətli yağış; **3.** *məc.* **(of)** sel, axın; **a ~ of arrows/of stones** ox/daş seli; **4.** yerə düşməmiş zərbə endirmək *(tennis, futbol oyununda)*

**volley[2]** [ˈvɔlɪ] *v* **1.** *hərb.* cəld atəş açmaq; **2.** yağdırmaq *(ox, daş)*; **3.** *id.* topa yerə dəyməmiş zərbə endirmək *(tennis, futbol oyununda)*

**volleyball** [ˈvɔlɪbɔ:l] *n* voleybol; **to play ~** voleybol oynamaq

**volt** [voult] *n el.* volt *(elektrik sahəsinin gərginlik vahidi)*

**voltage** [ˈvoultɪdʒ] *n el.* voltaj *(elektrik cərəyanının gərginlik dərəcəsi)*

**volte-face** [ˈvɔltˈfa:s] *n* **1.** *id., hərb.* geriyə dönmə; **2.** *məc.* dönüş, dönüm, dəyişiklik; tam dəyişmə *(fikri, mövqeyi)*

**voltmeter** [ˈvoultˌmi:təʳ] *n el.* voltmetr *(elektroliz hadisələrini müşahidə və tədqiq etmək üçün cihaz)*

**volubility** [ˌvɔljuˈbɪlɪtɪ] *n* **1.** söhbətcillik, danışqanlıq; uzunçuluq, sözçülük; **2.** rəvanlıq, səlislik *(söhbət haq.)*

**voluble** [ˈvɔljubl] *adj* **1.** söhbətcil, uzunçu, boşboğaz, naqqal, çərənçi, çoxdanışan; **2.** rəvan, səlis *(söhbət, şer haq.)*; **3.** *bot.* sarılan, sarmaşan *(bitki haq.)*

**volubly** [ˈvɔljublɪ] *adv* **1.** uzun, uzun-uzadı; **to speak ~** uzun/uzun-uzadı danışmaq; **2.** səlis, rəvan, duruxmadan *(nitq haq.)*

**volume** ['vɔljuːm; -jəm] *n* **1.** cild, tom; a **work in 5 ~s** 5 cildli/tomlu əsər; **2.** həcm; miqdar; **the ~ of liquid in the cask** çəlləkdəki/boçkadakı mayenin həcmi/miqdarı; **3.** tutum; **the ~ of a cask/of a case** çəlləyin/ çamadanın tutumu; **4.** güc, qüvvə, intensivlik; **a voice of great ~** çox güclü səs; **the ~ of storm** tufanın gücü/ intensivliyi; **5.** burum, sütun; **~s of smoke/of vapour** tüstü/buxar burumları; *Volumes of black smoke poured from the chimney Buxarıdan qara tüstü burumları çıxırdı*;
◊ **to speak/to tell ~s** aydın/gözəl/səlis danışmaq

**voluminous** [və'luːmɪnəs] *adj* **1.** çoxcildli, qalın *(kitab haq.)*; **a ~ dictionary** çoxcildli lüğət; **2.** məhsuldar *(yazıçı haq.)*; **3.** həcmli; çox gözəl; **~ hair** çox gözəl saç

**voluntarily** ['vɔləntərılı] *adv* **1.** könüllü, könüllü olaraq/surətdə, öz xoşu ilə; **2.** qəsdən, bilə-bilə, qərəzlə, şüurlu olaraq; **3.** özbaşına, sərbəst, istədiyi kimi

**voluntariness** ['vɔləntərınıs] *n* **1.** könüllülük; **2.** qəsdlə/qərəzlə edilmə, qəsdən olma

**voluntary** ['vɔlənrı] *adj* **1.** könüllü; **~ confession** könüllü etiraf; **~ army** könüllü ordu, könüllülərdən təşkil edilmiş ordu; **~ contribution** könüllü ianə; **~ national service** könüllü hərbi xidmət; **2.** sərbəst, icbari; **~ reading** icbari oxu *(ali təhsil müəssisələrində)*; **3.** şüurlu, qəsdən; bilə-bilə; **~ manslaughter/homicide** qəsdən öldürmə/ qətl; **~ discipline** şüurlu nizam-intizam; **4.** haqqı ödənilməyən, əvəzsiz *(iş haq.)*; məccani; **a ~ worker** məccani işləyən fəhlə

**volunteer**[1] [ˌvɔlən'tɪə^r] *n* **1.** könüllü; **2.** bir işi həvayı/məccani görən adam

**volunteer**[2] [ˌvɔlən'tɪə^r] *adj* **1.** könüllü; **~ army** könüllü ordu; **2.** özü-özündən çıxan; **~ plant** özü-özündən çıxan bitki

**volunteer**[3] [ˌvɔlən'tɪə^r] *v* **1.** təklif etmək *(köməyi və s.)*; **to ~ to do** *smth.* bir iş görməyə öz köməyini təklif etmək; **to ~ for** *smth.* bir işdə iştirak etmək üçün arzusunu bildirmək; **2.** öz arzusu/təşəbbüsü ilə etmək; **to ~ an opinion** öz arzusu ilə fikir söyləmək; **3.** könüllü getmək *(orduya)*

**voluptuary**[1] [və'lʌptjərı] *n* şöhrətpərəst adam

**voluptuary**[2] [və'lʌptjərı] *adj* şöhrətpərəst, şöhrət düşkünü

**voluptuous** [və'lʌptjuəs] *adj* **1.** ehtiraslı, şəhvani; şəhvətpərəst, şəhvət düşkünü; şəhvətli; **2.** qəşəng, gözəl, çox qəşəng/gözəl *(qadın, bədən forması haq.)*

**voluptuously** [və'lʌptjuəslı] *adv* **1.** ehtirasla, şəhvətlə; **2.** süzgün-süzgün, xumar-xumar, xumarlana-xumarlana; **3.** çox qəşəng/gözəl, təmtəraqla, dəbdəbə ilə

**vomit**[1] ['vɔmɪt] *n* **1.** qusma, öyümə; **2.** qusuntu; **3.** qusdurma dərmanı; qusdurucu dərman

**vomit**[2] ['vɔmɪt] *v* **1.** qusmaq, qaytarmaq *(həm də **to ~ out**)*; *He vomited his dinner O, naharını qusdu/qaytardı; She vomited blood O, qan qusdu*; **2.** püskürmək; **to ~ smoke /steam /lava /ashes** tüstü /buxar/lava/kül püşkürmək; *Dragons vomited fire and smoke Əjdahalar alov və tüstü püskürdülər*; **3.** *məc.* yağdırmaq *(həm də **to ~ forth/out**)*; **to ~ insults/curses** təhqirlər/qarğışlar yağdırmaq

**vomitive**[1] ['vɔmɪtɪv] *n tib.* qusdurucu dərman

**vomitive**[2] ['vɔmɪtɪv] *adj* qusdurucu, qusduran *(həm də məc.)*

**voodoo**[1] ['vuːduː] *n* **1.** cadugərlik, sehrbazlıq, ovsunçuluq; sehr, cadu, ovsun; **to put a ~ on** *smb.* bir kəsi cadulamaq/ovsunlamaq/sehrləmək; **2.** cadugər, sehrbaz, ovsunçu; şaman *(cadugər, falçı)*; ara həkimi, türkəçarəçi; **3.** həmail, dua, gözmuncuğu, tilsim

**voodoo**[2] ['vuːduː] *v* ovsunlamaq, cadulamaq, sehrləmək, tilsimə salmaq

**voodooism** ['vuːduɪzm] *n* **1.** cadugərlik, ovsunçuluq, şamanlıq *(ruhlara, magiyaya sitayiş – ibtidai din formalarından biri)*; **2.** cadugərliyə/sehrbazlığa inam

**voracious** [və'reɪʃəs] *adj* qarınqulu, acgöz, çoxyeyən; doymaq bilməyən; **~ sharks** qarınqulu/ acgöz köpək balıqları; **~ men** acgöz/qarınqulu/ çoxyeyən/doymaq bilməyən adamlar; **a ~ eater** qarınqulu; **a ~ reader** çox oxuyan/oxumaqdan doymayan oxucu

**voraciously** [və'reɪʃəslı] *adv* acgözlüklə; **to eat/to read ~** acgözlüklə yemək/oxumaq

**voracity** [və'ræsɪtɪ] *n* qarınquluuq, acgözlük, doymazlıq

**vortex** ['vɔːteks] *n (pl* **vertexes** *və ya* **vortices** [-tɪsiːz]) burağan, axın; qasırğa; girdab, burulğan *(həm də məc.)*; **atmospheric ~** atmosfer burağanı/ qasırğası; **the ~ of politics** siyasi burulğan; **to be drawn into the ~ of high society** yüksək cəmiyyətin burulğanında boğulmaq

**vortices** ['vɔːtɪsiːz] **vortex** *isminin cəm forması*

**votary** ['voutərı] *n* **1.** rahiblik andı içən/rahib olmağa söz verən şəxs; rahib, rahibə; **2. (of)** qızğın tərəfdar; **a ~ of peace** qızğın sülh tərəfdarı

**vote**[1] [vout] *n* **1.** səsvermə, səsə qoyma; **secret/open ~** gizli/açıq səsvermə; **roll-call ~, ~ by roll-call** adbaad səsvermə; **~ by (a) show of hands** əl qaldırmaqla səsvermə; **~ by sitting and standing,** *amer.* **rising ~** qalxmaqla səsvermə; **to take a ~** səsvermə keçirmək; **to proceed to a ~** səsverməyə başlamaq; **to put to the ~** səsə qoymaq; **to take a ~ on a question** məsələni səsə qoymaq; **to record a ~** səsvermədə iştirak etmək; *The vote was unanimous Qərar bir səslə qəbul edildi, Hamı qərarın lehinə səs verdi; The question goes to the vote Məsələ səsə qoyulur*; **2.** həlledici səs; *One man one vote Bir nəfər bir səs (seçkidə)*; **to cast a ~** səs vermək; **to tell/to count ~s** səsləri saymaq/hesablamaq; **to give** *one's* **~ for/to** *smb.* səsini bir kəsə vermək; **to win ~s** səs qazanmaq, çox səs almaq; *The votes went for adjourning the question Bu məsələnin təxirə salınması səs çoxluğu ilə qərara alındı*; **number of ~s recorded** səsvermədə iştirak edənlərin sayı; **3.** *top.i* verilən səslərin miqdarı, səs verənlərin miqdarı/sayı; **to carry /to gain all ~s** bütün səsləri qazanmaq/almaq, bir səslə keçmək *(seçkidən)*; *A. gained the vote against B. A B-dən çox səs aldı; The vote was light amer. Səsvermədə az adam iştirak etdi*; **4.** səsvermə hüququ; seçki hüququ; *Women have the vote Qadınların səsvermə hüququ var*; **5.** qərar, rəy *(səsvermə vasitəsilə çıxarılan qərar)*; **~ of confidence/of non-confidence** etimad/ etimadsızlıq rəyi; **to carry/to pass a ~** qərar qəbul etmək; **to reject a ~** təklifi rədd etmək; **6.** seçki bülleteni; **to cast** *one's* **~ into the urn** bülletenini qutuya salmaq

**vote**[2] [vout] *v* **1.** səs vermək; **to ~ for/against a proposal** təklifin lehinə/əleyhinə səs vermək; **to ~ for/against a candidate** namizədin lehinə/ əleyhinə səs vermək; **to ~ in the affirmative/in the negative** lehinə/əleyhinə səs vermək; **to ~ by/(a) show of hands** əl qaldırmaqla səs vermək; **2. (into)** seçmək; **to ~** *smb.* **into the chair/into a committee** bir kəsi sədr/komitənin üzvü seçmək; **to ~ into parliament** parlamentə seçmək; **3.** əksər səslə qərara almaq; *The assembly voted the address İclas müraciəti əksər səslə qəbul etdi*; **to ~ down** səsverməni pozmaq; *The proposal was voted down Təklif rədd edildi/qəbul edilmədi*; **to ~ in** seçmək *(səsvermə yolu ilə)*; *He was voted in Onu seçdilər, O seçildi*; **to ~ through** səsvermə yolu ilə keçirmək; *The bill has been voted through Qanun səsvermə yolu ilə qəbul edildi*

**voter** ['voutə^r] *n* seçici

**voting**[1] ['voutɪŋ] *n* səsvermə *(proses)*, səsə qoyma, səsvermədə iştirak *(xüs. seçkidə)*; **~ for a single candidate/for a list** namizədlərin fərdi şəkildə/ siyahı ilə seçilməsi; **to abstain from ~** seçkidə bitərəf qalmaq /səs verməmək

**voting**[2] ['voutɪŋ] *adj* səsvermə; seçki; **~ power/right** səsvermədə iştirak etmə hüququ; **~ slip** seçici/seçki bülleteni; **full ~ status** həlledici səs hüququ; **~ members of a committee** komitənin həlledici səsə malik olan üzvləri; **a ~ citizen** seçmə hüququna malik olan vətəndaş

**voting-paper** ['voutɪŋˌpeɪpə^r] *n* seçki bülleteni

**votive** ['voutɪv] *adj* anda görə icra edilən

**vouch** [vautʃ] *v* **1.** zamin durmaq/olmaq; **to ~ for** *smb.'s* **ability to pay** bir kəsin borcu verə bilmə qabiliyyətinə zamin olmaq; *I can't vouch for the truth of that statement Mən o bəyanatın həqiqət olduğuna zamin dura bilmərəm*; **2.** bildirmək; *He vouches that he was absent at that time O bildirir ki, o vaxt o orada deyildi*; **3.** təsdiq etmək *(xüs. sənədlə)*; *All expenses must be strictly vouched Bütün xərclər qəti şəkildə sənədlərlə təsdiq edilməlidir*

**vouchee** [vau'tʃiː] *n* **1.** *hüq.* zəmanətçi kimi məhkəməyə çağırılan şəxs; **2.** etibarlı mənbə

**voucher** ['vautʃə^r] *n* **1.** zamin, zəmanətçi; **2.** *hüq.* şahid; **3.** yazılı şəhadət/zəmanət; arayış; **sick ~** xəstəlik haqqında arayış, xəstəlik kağızı; **4.** qəbz; **~ for receipt** qəbul edilmə haqqında qəbz; **5.** etibarlı mənbə, sitat gətirilən müəllif; **6.** *hüq.* şahidi/zəmanətçini məhkəməyə çağırma

**vow**[1] [vau] *n* and, and içmə; **lovers' ~s** sevənlərin andı; **to break a ~** andı pozmaq; **to keep a ~** anda sadiq qalmaq

**vow**[2] [vau] *v* and içmək; təntənəli surətdə vəd vermək; **to ~ vengeance against** *smb.* bir kəsdən intiqam almaq haqqında and içmək; *He vowed that one day he would return O and içdi ki, bir gün qayıdacaq*

**vowel**[1] ['vauəl] *n fon.* sait *(səs)*

**vowel**[2] ['vauəl] *adj* sait; **~ sound** sait səs; **~ system** sait sistemi; *Each language has a different vowel system Hər bir dilin müxtəlif/fərqli sait sistemi var*

**voyage**[1] [vɔɪɪdʒ] *n* səyahət *(dəniz və ya hava ilə)*; **to go on a ~** səyahətə getmək *(dənizlə və ya hava ilə)*; *The voyage from England to India used to take 6 months İngiltərədən Hindistana dəniz səyahəti 6 ay çəkərdi*

**voyage**[2] [vɔɪɪdʒ] *v* **1.** səyahətə getmək/çıxmaq *(dənizlə və ya hava ilə)*; **2.** üzüb keçmək; **to ~ across the Atlantic** Atlantik okeanını üzüb keçmək

**voyager** ['vɔɪɪdʒə^r] *n* **1.** səyyah, səyahətçi; **2.** sərnişin *(gəminin, təyyarənin)*

**voyeur** ['vwaːjɔː^r] *n* **1.** başqalarının cinsi əlaqəsini xəlvəti izləyib həzz alan adam/cinsi ehtizaza gələn adam; **2.** passiv/qeyri-fəal müşahidəçi

**voyeurism** [vwa'ɔːrɪzəm] *n* **1.** başqalarının cinsi əlaqəsindən həzz alma; cinsi ehtisaza gəlmə **2.** passiv müşahidə

**v-shaped** ['viːʃeɪpt] *adj* = **v-type**

**v-type** ['viːtaɪp] *adj* pazşəkilli, pazaoxşar, pazvarı

**vulcanic** [vʌl'kænɪk] *adj* **1.** vulkan, vulkanik; **2.** *məc.* alovlu, odlu, hərarətli

**vulcanization, -isation** [ˌvʌlkənaɪ'zeɪʃn] *n* vulkanizasiya *(zədələnmiş avtomobil kamera və şinlərini təmir etmə üsulu)*

**vulcanize, -ise** ['vʌlkənaɪz] *v* vulkanizasiya etmək *(rezini)*

**vulcanizer, -iser** ['vʌlkənaɪzə^r] *n* vulkanizator (1) *vulkanizasiya ustası;* 2) *tex. vulkanizasiya aparatı)*

**vulcanologist** [ˌvʌlkə'nɔlədʒɪst] *n* vulkanoloq *(vulkan hadisələrini öyrənən mütəxəssis)*

**vulcanology** [ˌvʌlkə'nɔlədʒɪ] *n* vulkanologiya *(vulkan hadisələrini öyrənən elm sahəsi)*

**vulgar** ['vʌlgə^r] *adj* **1.** vulqar, bayağı; şit, kobud, ədəbsiz, qaba; **~ manners** ədəbsiz/qaba davranışlar; **~ expressions** ədəbsiz/qaba/bayağı ifa-

dələr; **a loud and ~ laugh** uca və ədəbsiz gülüş; a **~ joke** ədəbsiz zarafat; **~ features** üzün kobud cizgiləri; **2.** sadə xalq; **~ accent** sadə xalq ləhcəsi/danışığı; **to be ~ of speech** kobud danışmaq; **3.** xalq, ümumxalq, milli; **~ sayings** xalq zərbi-məsəlləri; **in the ~ tongue** ümumxalq dilində, doğma dildə; **~ Latin** xalq /loru latın dili; **4.** geniş yayılmış; **~ error** geniş yayılmış səhv; ◊ **~ era** bizim era; **~ fraction** *riyaz.* sadə kəsr

**vulgarism** ['vʌlgərɪzm] *n dilç.* **1.** vulqarizm *(ədəbi dil normalarına zidd olan qaba/kobud söz və ifadələr)*; **2.** vulqarlıq, kobudluq, qabalıq, ədəbsizlik

**vulgarity** [vʌl'gærɪtɪ] *n* vulqarlıq, qabalıq, kobudluq, tərbiyəsizlik

**vulgarization, -isation** [ˌvʌlgəraɪ'zeɪʃn] *n* vulqarlaşdırma, bayağılaşdırma; kobudlaşdırma, qabalaşdırma, həddən artıq sadələşdirmə

**vulgarize, -ise** ['vʌlgəraɪz] *v* vulqarlaşdırmaq, bayağılaşdırmaq; sadələşdirərək təhrif etmək

**vulgarly** ['vʌlgəlɪ] *adv* **1.** bayağı, bayağıcasına, kobud, kobudcasına; qaba, qabacasına; bayağı-bayağı, kobud-kobud, qaba-qaba; **2.** ədəbsiz, ədəbsizcəsinə, ədəbsiz-ədəbsiz

**vulnerability** [ˌvʌlnərə'bɪlɪtɪ] *n* zəiflik; tez dəymə/ toxunma *(söz, hərəkət)*

**vulnerable** ['vʌlnərəbl] *adj* tez sınan/inciyən; zəif, dişbatan; **~ spot** zəif yer/nöqtə

**vulpine** ['vʌlpaɪn] *adj* **1.** tülkü; **2.** bic, tülkü kimi; **a ~ smile** bic gülüş

**vulture** ['vʌltʃə$^r$] *n* **1.** *zool.* keçəl kərkəs *(leş yeyən quşlar)* qırğı; **2.** yırtıcı, vəhşi, quzğun *(adam haq.)*

**vulva** ['vʌlvə] *n (pl* **vulvas)** *anat.* vulva *(qadının xarici cinsi orqanı)*





**W w** ['dʌblju:] *n (pl* **W's, w's** ['dʌblju:z]) *ingilis əlifbasının 23-cü hərfi*

**Waaf** [wæf] *n* **Women's Army Auxiliary Air Force** *birləşməsinin qısa forması: d.d.* Hərbi Hava Qüvvələrində xidmət edən qadın

**wabble$^1$** ['wɔbl] *n* = **wobble$^1$**

**wabble$^2$** ['wɔbl] *v* = **wobble$^2$**

**wabbling** ['wɔblɪŋ] *n* = **wobbling**

**wabbly** ['wɔblɪ] *adj* = **wobbly**

**wacky** ['wækɪ] *adj amer. jarq.* **1.** səfeh, gicbəsər, dəlisov; qeyri-adi, çox qəribə; ağılsız, düşüncəsiz; **2.** etibarsız; şübhəli; **~ new** şübhəli xəbər/məlumat

**wad$^1$** [wɔd] *n* **1.** yumaq *(pambıq, yun və s.)*; **a ~ of cotton/wool** bir yumaq pambıq/yun; **2.** *d.d.* dəstə, büküm, topa *(pul, sənəd və s.)*; **a ~ of money** bir dəstə/paçka pul; *He pulled a wad of money out of his pocket O, cibindən bir dəstə pul/para çıxartdı*; **3.** parça; tikə, çimdik; **a ~ of snuff** bir çimdik burunotu; **4.** tıxac, sıxac

**wad$^2$** [wɔd] *v* **1.** yumrulamaq, bürmələmək, bürüşdürmək; bərk bükmək *(kağızı, pulu və s.)*; **2.** pambıq ilə doldurmaq/tıxamaq

**wadded** ['wɔdɪd] *adj* yun/yumşaq pambıq parçadan haşiyə verilmiş; **a ~ jacket/ dressing gown 1)** haşiyəli jaket/xalat; **2)** sırınmış / sırıqlı yorğan/xalat və s.

**wadding** ['wɔdɪŋ] *n* **1.** tıxama, basma *(yun, pambıq və s.)*; **2.** naxış vurma, haşiyə vermə *(parçaya)*; **3.** iç *(döşəkdə)*; **4.** astar, astar salma

**waddle$^1$** ['wɔdl] *n* yavaş-yavaş, yırğalana-yırğalana, yanını basa-basa yerimə

**waddle$^2$** ['wɔdl] *v* ləngər vura-vura/yırğalana-yırğalana/ yanını basa-basa yerimək; *The stout old man waddled across the road Kök qoca kişi yanını basa-basa /yavaş-yavaş küçəni keçdi*

**wade$^1$** [weɪd] *n* **1.** keçmə *(dayaz yerdən)*; **2.** dayaz yer, çay keçidi; **3.** bərə

**wade$^2$** [weɪd] *v* **1.** keçmək *(dayaz yerdən: həm də* **to ~ in)**; **2.** güc-bəla ilə keçmək *(palçıqdan, qardan və s.: həm də* **to ~ across/through)**; *He waded through the bushes O, kolluqdan güc-bəla ilə keçdi; There is no bridge – we'll have to wade across the stream Körpü yoxdur – biz bu çaydan bir təhər keçməli olacağıq*; **3.** öhdəsindən gəlmək; aradan qaldırmaq, dəf etmək *(çətinliyi, qəmi və s.: həm də* **to ~ through)**; *The boy waded through the dull book Oğlan maraqsız/ cansıxıcı kitabı bir təhər/güc-bəla ilə oxuyub başa vurdu*; **to ~ in/into 1)** baş vurmaq, yüyürərək keçmək, cummaq, şığımaq, üstünə cummaq, atılmaq, tullanmaq; *He waded in and saved the drowning child O, suya tullandı və batan uşağı xilas etdi; He waded single-handed into a man almost twice his size O, əliyalın özündən iki dəfə böyük olan adamın üstünə cumdu/şığıdı*; **2)** girişmək, başlamaq *(mübahisəyə, müzakirəyə, mübarizəyə)*; *She waded in with a fierce attack on company policy O, şirkətin yürütdüyü siyasəti amansızcasına/kəskin tənqid etdi*

**wader** ['weɪdə$^r$] *n* **1.** bataqlıq quşu; **2.** *zool.* vağ *(quş)*; **3.** *pl* uzunboğaz bataqlıq çəkməsi

**wading bird** ['weɪdɪŋ'bə:d] *n* bataqlıq quşu, bataqlıqda yaşayan quş

**wafer$^1$** ['weɪfə$^r$] *n* **1.** nazik vafli *(adət. dondurma üçün)*; **2.** surğuc, möhür; **3.** nazik dəyirmi çörək *(müqəddəs kommuna – protestantlar-katoliklər tərəfindən işlədilən)*

**wafer$^2$** ['weɪfə$^r$] *v* yapışdırmaq; möhürləmək

**waferer** ['weɪfərə$^r$] *n* vafli bişirən

**wafery$^1$** ['weɪfərɪ] *n* vafli bişirən çörəkxana

**wafery$^2$** ['weɪfərɪ] *adj* çox nazik, vafli kimi kövrək

**waff** [wa:f] *n* **1.** çırpma, çalma *(qanad)*; **2.** yüngül hərəkət; **3.** əsmə *(külək haq.)*, meh, xəfif yel; **4.** ani baxış/nəzər; **5.** vahimə, qarabasma

**waffle$^1$** ['wɔfl] *n* **1.** balaca tort *(çalınmış xəmirdən xüsusi tavada bişirilən)*; **2.** vafli

**waffle$^2$** ['wɔfl] *v d.d. jarq.* boş-boş danışmaq/yazmaq; *How that man does waffle on! O kişi nə boş-boş danışır; He waffled for hours O, saatlarla çərənlədi/ boş-boş danışdı*

**waffle-iron** ['wɔfl.aɪən] *n* vafli qabı

**waft$^1$** [wa:ft] *n* **1.** çalma *(qanad)*; **2.** əsmə *(külək)*; **3.** qulağa gələn səs; **4.** iy, qoxu, ətir iyi; **~s of cigar smoke** siqar tüstüsünün iyi; **~s of perfume** ətir iyi

**waft$^2$** [wa:ft] *v* **1.** aparmaq, qovub aparmaq/gətirmək; *The scent of the flowers was wafted to us by the breeze Xəfif külək güllərin/çiçəklərin ətrini qovub bizə gətirirdi*; **2.** sürətlə/bərk getmək *(suda, havada)*; **3.** eşidilmək, gəlib çatmaq *(səs və s.)*; *A song was wafted to our ears Mahnının səsi qulaqlarımıza gəlib çatdı; Delicious smells wafted up from the kitchen Mətbəxdən gözəl iylər/qoxular gəlirdi*; **4.** əsmək *(xəfif yel)*

**wag$^1$** [wæg] *n* I **1.** çalma, çırpma *(qanad)*; **2.** bulama *(quyruq)*; **with a ~ of the tail** quyruq bulamaqla

**wag** [wæg] *n* II **1.** zarafatçı, masqaraçı; **2.** *d.d.* proqulçu, proqul edən, üzürsüz işə gəlməyən, işə çıxmayan; tənbəl; **to play (the) ~** gəzmək, işə çıxmamaq

**wag$^1$** [wæg] *v* **(-gg-)** I **1.** çalmaq, çırpmaq *(qa-*

*nad);* 2. bulamaq, yelləmək *(quyruq: it və s.),* silkələmək *(barmaq); The dog wagged its tail İt quyruğunu buladı; Don't wag your finger at me! Barmağını /Barmağınızı mənə silkələmə!/silkələməyin!;* 3. *d.d.* çərənləmək; xobərçilik etmək, söz gəzdirmək; **to set tongues/chins /jaws / beards ~ging** dedi-qodu/qeybət üçün bir kəsin olinə bəhanə vermək; **to ~ *one's* chin/*one's* jaws/*one's* beard** qeybət etmək, çərənləmək; 4. başı ilə işarə vermək; yırğalamaq *(başı); Their heads wagged in time to the music Musiqi sədaları altında onların başı yırğalanırdı*
◊ **to ~ *one's* finger at *smb.*** bir kəsi barmağı ilə hədələmək; *So the world wags! Dünyanın işləri belədir!*

**wag** [wæg] *v d.d.* II gəzmək, işə çıxmamaq

**wage**[1] [weɪdʒ] *n (adət. pl)* 1. maaş, əmək haqqı *(fəhlənin, qulluqçunun) Wages are paid on Fridays Əmək haqqları/Maaş cümə günü verilir; His wages are 250000 manats a month Onun aylıq əmək haqqı 250000 manatdır; The workers have asked for a wage increase/rise Fəhlələr əmək haqqlarının artırılmasını xahiş ediblər;* **a living ~** yaşayış minimumu, yaşamaq üçün zəruri olan minimum vəsait; **nominal/real ~s** nominal/real əmək haqqı; 2. *tar.* əvəz, qarşılıq; *The wages of sin is death din. Günahın əvəzi ölümdür*

**wage**[2] [weɪdʒ] *adj* əmək haqqı; **~ scale** əmək haqqı cədvəli; **~ labour** muzdlu əmək; **~ ceiling /floor** *iqt.* qanunla müəyyən olunmuş maksimum/ minimum əmək haqqı

**wage**[3] [weɪdʒ] *v* 1. aparmaq *(müharibə),* həyata keçirmək; **~ war against/on a neighbouring country** qonşu dövlətə/ölkəyə qarşı müharibə aparmaq; 2. mübarizə etmək *(bir şeyin naminə);* **to ~ a compaign against sex discrimination** cinsi ayrı-seçkiliyə qarşı kampaniya /mübarizə aparmaq; 3. həyatını təhlükəyə qoymaq, riskə getmək

**wage-claim** [ˈweɪdʒˈkleɪm] *n* əmək haqqının artırılması tələbi

**wage-cut** [ˈweɪdʒ.kʌt] *n* əmək haqqının azaldılması

**wage-earner** [ˈweɪdʒ.ə:nəʳ] *n* 1. muzdla tutulan işçi, muzdla işləyən fəhlə; 2. ailəni dolandıran, ailə başçısı

**wage-freeze** [ˈweɪdʒ.fri:z] *n* əmək haqqının dondurulması

**wage-fund** [ˈweɪdʒ.fʌnd] *n* = **wages-fund**

**wage-rise** [ˈweɪdʒˈraɪz] *n* əmək haqqının artırılması

**wager**[1] [ˈweɪdʒəʳ] *n* mərc, bəhs; **to play/to make a ~** mərc gəlmək; **to win/to lose a ~** mərci udmaq/ uduzmaq

**wager**[2] [ˈweɪdʒəʳ] *v* 1. mərc gəlmək, pul qoymaq; **to ~ £ 6 on a horse** ata 6 funt sterlinq pul qoymaq; 2. risk etmək, qorxulu işə girişmək; həyatını riskə qoymaq

**wage-rate** [ˈweɪdʒ.reɪt] *n* əmək haqqı tarifi/cədvəli, maaş dərəcəsi

**wages-fund** [ˈweɪdʒɪzfʌnd] *n* əmək haqqı fondu

**wage-sheet** [ˈweɪdʒʃi:t] *n* = **wages-sheet**

**wages-sheet** [ˈweɪdʒɪzʃi:t] *n* əmək haqqı cədvəli/siyahısı

**wage-slavery** [ˈweɪdʒ.sleɪvərɪ] *n* icbari muzdlu əmək

**wage-work** [ˈweɪdʒwə:k] *n* muzdlu əmək

**wage-worker** [ˈweɪdʒ.wə:kəʳ] *n amer.* = **wage-earner**

**waggery** [ˈwægərɪ] *n (pl* **-ies***)* 1. dəcəllik, hoqqa; kobud zarafat; 2. zarafatcıllıq

**waggish** [ˈwægɪʃ] *adj* 1. nadinc, dəcəl; şux, oynaq; 2. zarafatyana; **~ remark** zarafatyana məzəmmət/irad

**waggle**[1] [ˈwægl] *n* çalma, çırpma; yelləmə, yırğalama

**waggle**[2] [ˈwægl] *v* 1. çalmaq, çırpmaq; silkələmək, yırğalamaq; silkələnmək, yırğalanmaq; **to ~ *one's* head** başını yırğalamaq/silkələmək; *She can waggle her ears O, qulaqlarını tərpədə bilir; Her bottom waggles when she walks Yeriyəndə onun yanbızı yırğalanır;* 2. axsamaq; axsaya-axsaya yerimək, ayaqlarını sürüyəsürüyə getmək

**waggly** [ˈwæglɪ] *adj* laxlayan, tərpənən, möhkəm olmayan

**wag(g)on**[1] [ˈwægən] *n* 1. araba; furqon; 2. taçka, əl arabası; 3. *d.y.* vaqon-platforma; **goods ~** yük vaqonu; 4. *d.d.* uşaq arabası; 5. **(the ~)** *amer.* polis karetası; 6. vaqonet, kiçik araba; 7. *amer. dən. sl.* gəmi; 8. *amer. av. sl.* təyyarə;
◊ **to be on the (water) ~** *sl.* içməyi tərgitmək, içməmək; **to hitch *one's* ~ to a star** ≅ şöhrətpərəstliyə qapılmaq, şöhrətpərəst xəyala qapılmaq; atını göylərə çapmaq; **Wagon** Böyük Ayı bürcü

**wag(g)on**[2] [ˈwægən] *v* 1. yük vaqonunda/furqonunda aparmaq; 2. vaqona yükləmək, arabaya/furqona doldurmaq

**wag(g)oner** [ˈwægənəʳ] *n* arabaçı, yükdaşıyan, kirəçi

**wag(g)onette** [.wægəˈnet] *n* uzununa iki oturacaqlı minik/ekipaj

**wagon-lit** [.vægɔnˈli:] *n fr.* yataqlı vaqon

**wagon-train** [.wægənˈtreɪn] *n* arabalar, araba karvanı

**wagtail** [ˈwægteɪl] *n* 1. *zool.* çaydaçapan, daşadöyən; 2. *arx.* fahişə, qəhbə, küçə adamı

**waif** [weɪf] *n* 1. balaca/cılız adam/uşaq; *She's such a poor little waif – I don't think she eats enough O elə balaca cılız adamdır ki – Məncə, o, kifayət qədər yemir;* 2. evsiz-eşiksiz adam; sahibsiz/ baxımsız /kimsəsiz uşaq; 3. yolunu azmış ev heyvanı; 4. sahibsiz/heç kimə lazım olmayan şey/əşya;
◊ **~s and strays** 1) sahibsiz/kimsəsiz uşaq; sahibsiz heyvan; *This kind old lady takes in waifs and strays Bu mərhəmətli yaşlı xanım sahibsizlərin qayğısına qalır/sahibsiz uşaqları himayə edir;* 2) tək-tək səpələnmiş/dağınıq əşyalar



**wail**[1] [weɪl] *n* 1. fəryad, nalə, fəğan, şivən; **~ (over) *one's* misfortunes** öz acınacaqlı taleyi haqqında fəryad qoparma; 2. uğultu, vıyıltı *(külək haq.);* **~ of the wind** külək vıyıltısı/uğultusu; 3. oxşama, ağı demə

**wail**[2] [weɪl] *v* 1. fəryad/fəğan etmək, nalə/şivən qopartmaq; 2. vıyıldamaq *(külək); The wind wailed Külək vıyıldadı;* 3. **(over, for, to)** oxşamaq, ağı demək, bir kəsi ağlamaq; *She was wailing for her lost child O, itmiş uşağı üçün ağı deyirdi/şivən qoparırdı*

**wailer** [ˈweɪləʳ] *n* ağıçı, ağı deyən *(qadın)*

**wailful** [ˈweɪlful] *adj şair.* kədərli, qəmli, hüznlü, qüssəli; qəmgin, həzin

**wailing** [ˈweɪlɪŋ] *adj* 1. şivən qoparan, fəryad edən; **a ~ child** şivən qoparan uşaq; **~ voice** fəryadlı səs; 2. vıyıldayan; *You can hear the wind wailing in the chimney Sən/Siz bacada küləyin vıyıltısını eşidə bilərsən/bilərsiniz*

**wailsome** [ˈweɪlsəm] *adj* iniltili, həzin, acınacaqlı, yanıqlı, kədərli, qəmgin, qüssəli

**wain** [weɪn] *n* 1. *şair.* araba; 2. **(the Wain)** *astr.* Böyük Ayı bürcü

**wainscot**[1] [ˈweɪnskət] *n mem.* taxta divar paneli *(aşağı haşiyə)*

**wainscot**[2] [ˈweɪnskət] *v* üz çəkmək/vurmaq *(taxtadan, dəmirdən və s.)*

**wainscot(t)ing** [ˈweɪnskətɪŋ] *n* 1. divara panellə haşiyə vurma; 2. divara üz çəkmə/vurma üçün lazım olan material

**wainwright** [ˈweɪnraɪt] *n* araba ustası, araba qayıran, arababənd

**waist** [weɪst] *n* 1. bel, qurşaq; **small ~** nazik/incə bel; *The girl was stripped to the waist Qızı qurşağacan soyundurmuşdular; She tied the rope round her waist O, ipi belinə bağladı;* 2. boğum, dar hissə *(skripka və s. haq.);* 3. *amer.* 1) korset, döşlük, lifçik *(paltarda);* 2) düyməsiz uşaq köynəyi; uşaq alt köynəyi; 3) *amer.* bluzka, qadın koftası

**waist-band** [ˈweɪs(t)bænd] *n* 1. toqqa, qayış, kəmər; qurşaq, belbağı *(yubka yaxud şalvar üçün);* 2. *hərb.* kəmər, toqqa, qayış

**waistcoat** [ˈweɪskout] *n* gödəkcə, jilet *(qolsuz qısa geyim);* **sleeved ~** qollu toxunma jilet; iş gödəkcəsi

**waist-deep** [ˈweɪstˈdi:p] *adv* qurşağacan, beləcən, qurşağa qədər; **~ in the water** qurşağacan suda; **to wade ~ into a stream** qurşağacan axına/suya girmək

**waist-high** [ˈweɪsthaɪ] *adv* qurşağa/belə qədər; *The wheat was waist-high Taxıl belə/qurşağa çatırdı*

**waist-line** [ˈweɪstlaɪn] *n* bel, bel xətti; **a girl with a neat ~** incə belli qız; **a dress with a high ~** bel xətti yuxarı olan paltar

**wait**[1] [weɪt] *n* 1. gözləmə; **two-hour ~** iki saat gözləmə; *We had a long wait for the train Biz qatarı uzun müddət gözlədik;* 2. *teatr.* fasilə; antrakt; 3. pusqu; pusma, güdmə; 4. **Waits** *pl* Milad bayramında küçədə İsanı mədh edənlər *(müğənnilər və s.)*
◊ **to lay ~ for *smb.*** bir kəsə pusqu qurmaq; **to lie in ~ for *smb.*** bir kəsi pusmaq/güdmək

**wait**[2] [weɪt] *v* 1. **(for)** gözləmək; *Wait for me, please Zəhmət olmasa, məni gözlə/gözləyin; Don't keep me waiting Məni gözləməyə məcbur etmə/ etməyin; We are waiting for the rain to stop Biz yağışın kəsməsini gözləyirik; His wife never keeps him waiting Onun arvadı heç vaxt onu gözləməyə məcbur etmir/gözlətmir; I have been waiting (for) 20 minutes sharp Mən düz 20 dəqiqədir ki, gözləyirəm; The President agreed to speak to the waiting journalists Prezident onu gözləyən jurnalistlərlə danışmağa razı oldu; Wait for a bus at a bus-stop Avtobus dayanacağında avtobus gözlə/ gözləyin; You'll have to wait your turn Sən/Siz öz növbəni/növbənizi gözləməli olacaqsan/ olacaqsınız; I was just waiting for that to happen Mən elə onun bu cür olacağını gözləyirdim;* 2. **(to ~ at/ on/upon)** xidmət /qulluq etmək *(kiməsə: stol arxasında);* **to ~ at table** müştərilərə qulluq etmək *(restoranda);* 3. həmrah olmaq, yanaşı getmək, müşayiət etmək; **to ~ a funeral** tabutu müşayiət etmək, son mənzilə yola salmaq; yar olmaq **(to ~ upon)**; *May success wait upon you Uğur sənə/sizə yar olsun!* 4. *d.d.* təxirə salmaq, yubatmaq, başqa vaxta keçirmək *(naharı); Don't wait dinner for me! I shall be late Naharı mənə görə yubatma/ yubatmayın! Mən gec gələcəyəm; It can wait until tomorrow: it's not urgent Sabaha qədər təxirə salmaq olar. Bu, təcili deyildir; No Waiting! Burada maşın saxlamaq qadağandır!* **to ~ behind** qalmaq; *Please, wait behind after class today Zəhmət olmasa, bu gün dərsdən sonra qal/qalın;* **to ~ in** evdə qalıb gözləmək; *I waited in all day but the plumber never came Mən bütün günü evdə qalıb gözlədim, lakin su kəməri işçisi gəlib çıxmadı;* **to ~ off** *id.* gücünü yarışın sonuna saxlamaq; **to ~ on/ upon** 1) qulluq etmək; 2) bir kəsə dəymək/baş çəkmək; *Our commercial agent will wait upon you next Monday Bizim ticarət agenti gələn bazar ertəsi sənə/sizə baş çəkəcək;* **to ~ up** gözləmək; *to ~ up for smb. bir kəsi gözləmək; I'll be back very late tonight, so don't wait up (for me). Bu gecə mən çox gec gələcəyəm, ona görə də məni gözləmə/gözləməyin;* **to ~ upon** 1) qulluq etmək, baxmaq, xidmət etmək; *Clerks wait upon shoppers Satıcılar müştərilərə/alıcılara xidmət edirlər;* 2) qulluq/ xidmət/pərəstişkarlıq etmək; **to ~ upon a lady** xanıma pərəstişkarlıq etmək; *He waits upon his wife hand and foot O, arvadının bütün şıltaqlıqlarını yerinə yetirir.*
◊ *Wait and see Baxarıq. Yaşayarıq – görərik*

**wait-a-bit** [ˈweɪtəˈbɪt] *n d.d.* tikanlı kolluq
**wait-and-see** [ˈweɪtəndsiː] *adj* gözləmə; ~ **policy** gözləmə siyasəti
**waiter** [ˈweɪtəʳ] *n* **1.** ofisiant *(aşxanada yemək paylayan xidmətçi); Ask the waiter for the bill Ofisiantdan haqq-hesabı soruş/soruşun; I tried to catch the waiter's attention Mən ofisiantın diqqətini cəlb etməyə çalışdım;* **2.** qəbula/görüşə gələn adam və s.; **3.** podnos, məcməyi, sini; **4.** *arx.* kamerdiner, otaq xidmətçisi *(keçmişdə: ağaların xüsusi xidmətçisi)*
**waiting¹** [ˈweɪtɪŋ] **to wait** *felinin pr formasi*
**waiting²** [ˈweɪtɪŋ] *n* **1.** gözləmə; **tedious** ~ cansıxıcı/bezikdirici gözləmə; **2.** xidmət, xidmət /qulluq etmə
**waiting³** [ˈweɪtɪŋ] *adj* **1.** gözləyən; ~ **list** namizədlərin siyahısı *(vəzifə tutmaq üçün)*; **2.** növbədə dayananların siyahısı *(ev almaq üçün və s.)*; **to put** *smb.* **on the** ~ **list** bir kəsi növbə siyahısına yazmaq/salmaq
**waiting game** [ˈweɪtɪŋ.geɪm] *n* gözləmə taktikası; *The government is playing a waiting game with the unions that are on strike Hökumət tətil edən həmkarlar təşkilatları ilə gözləmə oyunu oynayır*
**waiting-list** [ˈweɪtɪŋˈlɪst] *n* gözləyənlərin siyahısı *(vəzifə, ev alma; görüş üçün, bilet almaq üçün və s.)*
**waiting-room** [ˈweɪtɪŋ.ruːm] *n* **1.** qəbul otağı *(həkimin)*; **2.** *d.y.* gözləmə otağı/zalı
**waitress** [ˈweɪtrɪs] *n* qadın ofisiant
**waive** [weɪv] *v* **1.** *hüq.* hüquqdan/ tələbatdan imtina etmək/ əl çəkmək; **to** ~ **a claim/right** iddiasından /hüququndan imtina etmək; *We have decided to waive the tuition fees Biz təhsil haqqından imtina etmək qərarına gəldik;* **to** ~ **a demand** tələbatdan əl çəkmək/imtina etmək; **2.** müvəqqəti təxirə salmaq/yubatmaq; *Let's waive this question until later Gəlin bu məsələnin müzakirəsini təxirə salaq*
**waiver** [ˈweɪvəʳ] *n* **1.** *hüq.* imtina, əl çəkmə *(hüququndan, iddiasından və s.)*; **2.** imtina haqqında sənəd; *We signed a waiver of our claim Biz iddiamızdan əl çəkmə haqqındakı sənədə qol çəkdik;* **3.** çıxarma, ləğv etmə *(nizamnamədən, qanundan və s.)*
**wake¹** [weɪk] *n* **1.** *şair.* ayıq/yuxusuz qalma, yatmama; ayıqlıq, sayıqlıq; **sleep and** ~ ayıq-sayıq yatma; **2.** yuxusuz qalma *(cənazənin yanında)*; **3.** *din.* bayram nəfəsi
**wake²** [weɪk] *v* (*pt* **woke, waked** [-t]; *pp* **waked, woke, woken**) **1.** yuxudan oyanmaq/ayılmaq (*həm də* **to** ~ **up**); *She usually wakes (up) early O adətən erkən oyanır; What time do you usually wake (up)? Yuxudan adətən nə vaxt oyanırsan /oyanırsınız?; He woke up with a start O diksinərək yuxudan oyandı;* **2.** yuxudan qaldırmaq/oyatmaq (*həm də* **to** ~ **up**); *The children's shouts woke us out of nap Uşaqların qışqırtısı bizim mürgümüzü qaçırtdı/bizi mürgüdən ayıltdı; Wake him up! Onu yuxudan qaldır!/ qaldırın! Don't wake the baby! Uşağı oyatma!/ oyatmayın! The noise woke me (up) Səs məni oyatdı; What time do you want to be waked? Səni/ Sizi nə vaxt qaldıraq?;* **3.** yada salmaq, oyatmaq; doğurmaq, baş qaldırmaq, canlandırmaq *(arzu, xatirə, şübhə və s.)*; **to** ~ **the memories of the past** keçmiş xatirələri oyatmaq/yada salmaq; **to** ~ **emotion** hiss oyatmaq; **to** ~ **passions** ehtirasları oyatmaq; **4.** oyanmaq, canlanmaq, baş qaldırmaq; *Nature wakes in spring Yazda təbiət oyanır; His conscience woke Onun vicdanı oyandı; A cold shower will soon wake you up! Soyuq duş tezliklə səni/sizi özünə/özünüzə gətirər;* **5.** ayıq qalmaq, yatmamaq, yuxusuz qalmaq; *They cannot be waking at this late hour Onlar belə gec vaxtda yatmaya/oyaq qala bilməzlər;* **6.** ayılmaq, özünə gəlmək; **to** ~ **from a stupor** huşu başına gəlmək, ayılmaq; **7.** **(to)** dərk etmək, anlamaq, başa düşmək; **to** ~ **to danger** təhlükəni dərk etmək/başa düşmək; **to** ~ **a possibility** imkanı/şəraiti başa düşmək; *He woke to danger O, təhlükəni dərk etdi/anladı*
**wakeful** [ˈweɪkfl] *adj* **1.** ayıq, oyaq, yatmayan; *The children were still wakeful though it was eleven o'clock Saat on bir olmağına baxmayaraq, uşaqlar hələ də yatmamışdılar /oyaq idilər;* **2.** yuxusuz, yuxusu ərşə çəkilən; **to pass a** ~ **night** yuxusuz gecə keçirmək; **a** ~ **baby** yuxusuz/yatmayan bəbə/ çağa; **3.** *məc.* ayıq, sayıq, ayıq-sayıq; diqqətli, gözüiti; ~ **eye** ayıq-sayıq gözətçi
**wakeless** [ˈweɪklɪs] *adj* bərk, möhkəm *(yuxu haq.)*
**waken** [ˈweɪkən] *v* **1.** yuxudan oyatmaq/qaldırmaq; **2.** oyanmaq; *She wakened at dawn O, o başdan /sübh çağı oyandı; I was wakened by the sound of a car starting Məni işə düşən maşının səsi yuxudan qaldırdı/oyatdı;* **3.** *məc.* oyatmaq, doğurmaq, oyandırmaq *(ümid və s.)*; **to** ~ **hope** ümid doğurmaq; **to** ~ **a deep concern in people** insanlarda /adamlarda dərin qayğı/təlaş/narahatlıq oyatmaq
**wakening¹** [ˈweɪk(ə)nɪŋ] *n* oyanma, ayılma; oyandırma, oyatma; ayıltma; **the** ~ **of nature** təbiətin oyanması
**wakening²** [ˈweɪk(ə)nɪŋ] *adj* oyanan *(həm də məc.)*
**waking¹** [ˈweɪkɪŋ] *n* **1.** oyanma; yatmama; *She spends all her waking hours of her life caring for others O, bütün oyaq vaxtlarını başqalarının qayğısına qalmağa sərf edir;* **2.** yuxusuzluq, yuxusu ərşə çəkilmə; **nights of** ~ yuxusuz gecələr; **eyes red with** ~ **and weeping** yuxusuzluqdan və ağlamaqdan qızarmış gözlər
**waking²** [ˈweɪkɪŋ] *adj* **1.** yuxusuz, ayıq qalan, yatmayan; **one's** ~ **hours** ayıq saatlar; **to keep** *smb.* ~ bir kəsi yatmağa qoymamaq; **2.** *məc.* ayıq, sayıq, ayıq-sayıq, diqqətli, ehtiyatlı
**wale¹** [weɪl] *n* **1.** şırım, iz *(qamçı zərbəsindən)*; **2.** *toxuc.* tikiş, sırıq *(paltarda)*, qabarıq zolaq *(parçada)*



**wale²** [weɪl] *v* **1.** zolaq-zolaq etmək, şırım qoymaq, zolaqlamaq *(qamçı ilə)*; **2.** *toxuc.* parçada qabarıq zolaqlar toxumaq
**Waler** [ˈweɪləʳ] *n* Cənubi Avstraliyada at cinsinin adı
**walk¹** [wɔːk] *n pl* **walks** [wɔːks] **1.** piyada gəzmə, gəzib dolaşma, ayaqseyrinə çıxma; ; **to have a** ~ gəzib dolaşmaq; **to go for a** ~ piyada gəzməyə getmək; **to go ~s with children** uşaqları gəzməyə çıxartmaq/aparmaq; **to take a** ~ gəzmək, ayaqseyrinə çıxmaq, gəzib dolaşmaq; *The baby is learning to walk Uşaq gəzməyi öyrənir;* **2.** gəzinti; **long/short** ~ uzun/qısa gəzinti; **morning/evening** ~ səhər/axşam gəzintisi; **space** ~ kosmos gəzintisi; *She's taken the dog for a walk O, iti gəzməyə apardı;* **3.** yeriş, yeriş tərzi; *I recognized him at once by his walk Mən onu dərhal yerişindən tanıdım; After running for two miles he dropped into a walk İki mil qaçandan sonra o, yerişə keçdi; His walk is just like his father's Onun yerişi düz atasının yerişi kimidir/atasının yerişinə oxşayır;* **4.** addım; **to go at a** ~ addım-addım yerimək; **5.** məsafə; **a mile's** ~ **from here** buradan bir mil məsafədə; *The station's just a ten-minute walk from here Vağzal buradan təxminən on dəqiqəlik məsafədədir;* **6.** gəzinti yeri, seyrəngah; *My favourite walk is in the neighbourhood Mənim sevimli gəzinti yerim qonşuluqdadır;* **7.** hasarlanmış yer *(otlaq və s.)*; **8.** *id.* piyada yerimə üzrə yarış;
◊ **a** ~ **of life** peşə, məşğuliyyət, sənət, ictimai vəziyyət; *They interviewed people from all walks of life Onlar müxtəlif peşə sahiblərindən müsahibə götürdülər; She has friends from all walks of life Onun müxtəlif peşə sahibləri arasında dostları vardır*
**walk²** [wɔːk] *v* **1.** piyada/ayaqla getmək, ayaqseyrinə çıxmaq; *We walked five miles Biz beş mil piyada getdik; When it's a nice day, I walk to work, otherwise I go by bus Hava yaxşı olanda mən işə piyada, başqa vaxtda avtobusla gedirəm; The old lady walked slowly in the garden Yaşlı xanım yavaş-yavaş bağda gəzdi;* **2.** yerimək, hərəkət etmək/gəzib dolaşmaq, var-gəl etmək; *How old are babies when they learn to walk? Uşaqlar neçə yaşından yeriməyi öyrənirlər?; He was walking up and down the station platform O, dəmiryol stansiyasının platformasında gəzib dolaşırdı/var-gəl edirdi; He was walking on crutches O, qoltuq ağacı ilə gəzirdi;* **to** ~ **slowly/steadily** yavaş/aramsız / dayanmadan yerimək; **3.** aparmaq, gəzdirmək, gəzməyə aparmaq, dolandırmaq *(atı, iti və s.)*; *He's out walking the dog every evening O hər axşam iti bayıra gəzməyə aparır; He was walking his horse up and down O, atını aşağı-yuxarı gəzdirirdi; I'll walk you home Mən səni/sizi evə apararam; He walked the woman to her car O, qadını maşınına ötürdü;* **4.** zahir olmaq, zühur etmək, görsənmək *(xəyal, kölgə, kabus); The ghost walks at midnight Kabus gecə yarısı peyda olur/zühur edir;* **5.** *arx. şair.* özünü aparmaq, yaşamaq; **to** ~ **humbly** özünü dinc/başıaşağı aparmaq; **to** ~ **honestly 1)** namusla yaşamaq; **2)** *din.* özünü ədəblə/ehtiramla aparmaq; **to** ~ **about** gəzmək, gəzib dolaşmaq, dolaşmaq; *We could hear him all night walking about the room Biz onun bütün gecəni otaqda gəzişməsini eşidirdik;* **to** ~ **around 1)** dolaşmaq, gəzib dolaşmaq; *I have walked this district for mile around Mən bütün bu rayonu eninə-uzununa gəzib dolaşmışam;* **2)** ötürmək, üstündən keçmək, toxunmamaq, buraxmaq; *Critics walk around it gently Tənqidçilər onun üstündən ehmalca ötürlər/ keçirlər;* **to** ~ **away** uzaqlaşmaq, çıxıb getmək; **to** ~ **away from** *smb./smth.* **1)** bir kəsi/şeyi asanlıqla ötüb keçmək; *My horse just walked away from all the others in the race Mənim atım bütün başqa atları yarışda ötüb keçdi; You can't just walk away from your responsibilities Sən/Siz öz məsuliyyətindən/məsuliyyətinizdən yaxanı/ yaxanızı qurtara bilməzsən/bilməzsiniz;* **2)** bir kəsə/şeyə qalib gəlmək, bir kəsi məğlub etmək; *Tom walked away from all his enemies Tom bütün düşmənlərinə qalib gəldi; The Oxford crew walked away from Cambridge Oksford komandası yarışda Kembric komandasına qalib gəldi;* **to** ~ **away/off 1)** aparmaq, özü ilə aparmaq; *The mother walked the child away Ana uşağını özü ilə apardı; A policeman walked him off Polis onu özü ilə apardı;* **2)** uzaqlaşmaq, çıxıb getmək; *He didn't like our attitude and at once walked off O bizim ona olan münasibətimizi xoşlamadı və dərhal çıxıb getdi;* **to** ~ **away/off with 1)** oğurlamaq, qaçırmaq; *Someone has walked off with my umbrella Kimsə mənim çətirimi oğurlayıb; Somebody has walked off with my pen Kimsə mənim qələmimi oğurlayıb/ çırpışdırıb;* **2)** yüngül/asanlıqla qələbə çalmaq/ qazanmaq/ əldə etmək; *She walked away with gold medal O asanlıqla qızıl medal qazandı; Smith walked away with the match Smit asanlıqla yarışda qələbə çaldı/qazandı;* **to** ~ **back 1)** geri qayıtmaq; **2)** *jarq.* imtina etmək, əl çəkmək, geri dönmək *(sözündən, mövqeyindən və s.)*; **to** ~ **in/into 1)** içəri girmək, daxil olmaq; *Please, walk in Buyur/ Buyurun, içəri gir/girin;* **2)** *sl* özünü salmaq *(yeməyin üstünə)*; acgözlüklə yemək/ ötürmək; salmaq; *He walked into a meat-pie O özünü ət piroqunun üstünə saldı;* **3)** *məc.* düşmək *(ehtiyatsızlıq ucbatından); They set a trap for him and he walked right into it Onlar onun üçün tələ qurdular və o da düz o tələyə düşdü;* **4)** bir kəslə/şeylə toqquşmaq; *She wasn't looking where she was going and walked straight into me O hara getdiyinə baxmırdı və odur ki, mənimlə toqquşdu/ düz mənim üstümə çıxdı;* **to** ~ **on 1)** irəli getmək; **2)** davam etdirmək *(gəzintini)*; **3)** *teatr.* sözsüz rol oynamaq; **to** ~ **out**

1) *d.d.* tətil etmək; *The men in this factory walked out yesterday Bu fabrikin adamları dünən tətil etdilər;* 2) çıxıb getmək *(etiraz əlaməti olaraq)*; **to ~ out with** gəzmək *(bir kəslə)*; **to ~ out on** ***smb.*** bir kəsi tərk etmək/atmaq/qoyub çıxıb getmək; *He had a row with his wife and just walked out on her O, arvadı ilə savaşdı və onu atıb çıxıb getdi;* **to ~ over** 1) adlayıb/üstündən keçmək; 2) hesablaşmamaq *(bir kəsin hissləri ilə)*; pis rəftar etmək; *Don't let your husband walk over you like that Ərinizə səninlə/sizinlə pis rəftar etməyə yol verməyin;* 3) rəqibini asanlıqla ötüb keçmək, yüngül qələbə qazanmaq *(yarışda və s.)*; **to ~ up to** ***smb./smth.*** 1) bir kəsə/bir şeyə yaxınlaşmaq; *A tall man walked up to me and shook my hand Hündürboylu bir kişi mənə yaxınlaşdı və mənimlə əl tutdu; She walked up to the desk and asked to see the manager O, piştaxtaya /kontorkaya yaxınlaşdı və meneceri görmək istədiyini bildirdi;* 2) gəzmək, dolaşmaq *(bir yer boyunca)*; *She walked up Oxford Street O, Oksford küçəsi boyunca gəzdi/dolaşdı;* 3) yuxarı çıxmaq, qalxmaq; *He walked up Peak N. last month Keçən ay o, N. zirvəsinə çıxdı;* 4) *teatr.* daxil olmaq, içəri girmək *(sirkə, tamaşaya)*; *Walk up, ladies and gentlemen and see our wonderful show! Xanımlar və cənablar içəri girin və bizim bu gözəl tamaşamıza baxın!*

◊ **to ~ in on** ***smb.*** qəflətən yaxalamaq; heyrətə salmaq; **to ~ out on** ***smb.*** əkilmək, pis gündə qaçmaq, yayınmaq *(bir kəsdən)*; **to ~ the boards** aktyor olmaq; **to ~ one's chalks** *sl* qaçmaq, **to ~ on air** ≅ gözü ayağının altını görməmək, sevincdən uçmaq; **to ~ the floor** var-gəl etmək; **to ~ the hospitals** xəstəxanada praktika keçmək *(tələbə haq.)*; **to ~ smb. round** bir kəsi barmağına dolamaq; **to ~ in golden/silver slippers** ≅ cah-calal içərisində üzmək, çox zəngin olmaq; *Don't run before you can walk ≅ Çayı keçməmiş "hop" demə! Çay gəlməmiş çırmanma*

**walkable** [ˈwɔ:kəbl] *adj* keçilən, gedilən, piyada gedilə bilən; **~ distance** piyada gedilə bilən məsafə

**walkaway** [ˈwɔ:kə.weı] *n* yüngül/asan qələbə *(yarışda)*

**walker** [ˈwɔ:kəʳ] *n* 1. piyada, yolçu; *I am not much of a walker Mən piyada çox gedə bilmirəm; She was an excellent walker O, əla yolçu idi, yorulmadan gedə bilirdi;* 2. *id.* itigedən/itiyeriyən / ayaqdan iti adam; **long-distance ~** uzun məsafəni itigedən adam

**walkie-lookie** [ˈwɔ:kıˈlukı] *n rad. sl.* portativ/yığcam / yanda gəzdirilə bilən televiziya aparatı

**walking¹** [ˈwɔ:kıŋ] *n* 1. gəzmə, yerimə, hərəkət etmə; **to be fond of ~** yeriməyi/piyada gəzməyi xoşlamaq; *I prefer walking to driving Mən piyada gəzməyi maşınla getməkdən üstün tuturam;* 2. yeriş; 3. yol *(piyadalar üçün)*; *Easy walking Yaxşı yol (piyadalar üçün); The walking here is bad Bu yol (piyadalar üçün) gediş-gəliş üçün pisdir*

**walking²** [ˈwɔ:kıŋ] *adj* 1. piyada gəzən, yeriyən; *It is within walking distance Ora piyada getmək olar;* 2. *tex.* addımlayan; **~ excavator** addımlayan ekskavator;

◊ **~ corpse** quru cəsəd *(çox arıq adam haq.)*; **~ dictionary/encyclopedia** canlı lüğət/ensiklopediya *(hər şeydən məlumat verə bilən adam)*; *She is a walking dictionary/encyclopedia O, canlı ensiklopediyadır, O çox məlumatlıdır, ≅ O, bilik dağarcığıdır;* **~ delegate** həmkarlar təşkilatının sədri; **~ gentleman** *teatr.* statist; **~ lady** statistka *(səhnədə sözsüz rolları oynayan şəxs)*; **a ~ part** sözsüz rol

**walking-case** [ˈwɔ:kıŋˈkeıs] *n tib.* gəzən, gəzə bilən xəstə

**walking-dress** [ˈwɔ:kıŋdres] *n* bayır paltarı *(qadın üçün)*

**walking-orders** [ˈwɔ:kıŋ.ɔ:dəz] *n* = **walking-papers**

**walking-papers** [ˈwɔ:kıŋ.peıpəz] *n pl d.d.* işdən çıxarma; işdən azad edilmə; **to get the ~** işdən çıxarılma/çıxma haqqında sənəd almaq, işdən azad olunmaq; *He was given his walking-papers Ona çıxarılma haqqında sənəd verdilər*

**walking-race** [ˈwɔ:kıŋreıs] *n* idman yerişi üzrə yarış

**walking-shoes** [ˈwɔ:kıŋʃu:z] *n pl* yeriş ayaqqabısı *(alçaqdabanlı)*

**walking-stick** [ˈwɔ:kıŋstık] *n* əl ağacı

**walking-ticket** [ˈwɔ:kıŋ.tıkıt] = **walking-papers**

**walk-out** [ˈwɔ:kˈaut] *n d.d.* 1. tətil; **National ~** Ümumi tətil; 2. *hərb.* fərarilik; 3. təşkilatdan/ iclasdan çıxıb getmə *(etiraz əlaməti olaraq)*; 4. *amer.* dükandan heç bir şey almayıb çıxıb gedən alıcı

**walk-over** [ˈwɔ:kˈouvəʳ] *n* 1. yüngül qələbə *(xüs. yarışda)*; 2. *məc.* yüngül/asan iş, sadə/adi iş; *A job like that is a walk-over for him Belə iş onun üçün adi bir şeydir*

**walk-up¹** [ˈwɔ:kˈʌp] *n amer. d.d.* liftsiz ev; **a ~ flat** liftsiz mənzil; *It's not easy living in a 6th floor walk-up Liftsiz 6-cı mərtəbədə yaşamaq çətindir/ asan deyildir*

**walk-up²** [ˈwɔ:kˈʌp] *adj* liftsiz *(bina haq.)*

**walkway** [ˈwɔ:kweı] *n* 1. geniş gediş-gəliş yolu, geniş piyada yolu; xiyaban, alleya; 2. *dən.* keçid

**wall¹** [wɔ:l] *n* 1. divar; **a stone/brick ~** daş/kərpic divar; **to stand at the ~** divarın yanında dayanmaq; **a blank/dead ~** bütöv/qapısız/pəncərəsiz divar; *Hang the picture on the wall Şəkli divardan as!/ asın!;* 2. damba, torpaq bənd; hasar, barı; 3. *məc.* maneə, əngəl; **~ of partition** uçurum, keçilməz sədd *(insanlar arasında)*; *The tidal wave formed a terrifying wall of water Qabaran/Çəkilən dalğalar dəhşətli bir su maneəsi yaratdı; The investigators were confronted by a wall of silence Müstəntiqlər sükut maneəsi ilə qarşılaşdılar;* 4. *məc.* sıx sıra, səf; **~ of armed men** silahlı adamların sıx sırası/səfi; **~ of fire** şiddətli atəş maneəsi; 5. *anat.* divar; **the ~s of the heart** ürəyin divarları;



◊ **to bang one's head against a brick ~** daşdan pul çıxartmaq, mümkün olmayan şeyi etməyə çalışmaq; **to come/to run up against a brick ~** ≅ oxu daşa dəymək, maneə ilə üzləşmək; *There was a lot of bureaucracy involved and I kept coming up against a brick wall Orada hər şey bürokratizmə çulğalanmışdı və mən həmən maneə ilə üzləşdim;* **to give smb. the ~** yana çəkilmək, yol vermək; **to go to the ~** 1) müvəffəqiyyətsizliyə uğramaq, uğursuz olmaq, bəxti gətirməmək; 2) iflasa uğramaq, sınıq çıxmaq; *The weakest goes /must go to the wall ≅ Zəifləri əzişdirirlər, Zəifləri döyürlər; His honour went to the wall Onun namusu/şərəfi ləkələnmişdir, O, rüsvay olmuşdur;* **to push/to drive/to thrust to the ~** divara dirəmək, çıxılmaz vəziyyətə salmaq; **to see through a brick/through a stone/through a mud ~** son dərəcə gözüaçıq olmaq, yerin altını da, üstünü də bilmək, fərasətli olmaq; **to have /to take the ~ of smb.** heç kəsə yol verməmək, kənara çəkilməmək; **with one's back to the ~** çıxılmaz vəziyyətdə; *Walls have ears Divarların da qulağı var; Be careful what they say – even the walls have ears! Onların dediyinə diqqətlə qulaq as – hətta divarların da qulağı var*

**wall²** [wɔ:l] *v* 1. divar/hasar/barı çəkmək, hasarlamaq; *He walled his garden O, bağını hasarladı/hasara aldı;* 2. divarla ayırmaq; *Part of the yard had been walled off Həyətin bir hissəsi divarla ayrılmışdı;* 3. *tar.* möhkəmlətmək, istehkam tikmək; 4. *məc.* sədd çəkmək, şübhə/inamsızlıq yaratmaq; **to ~ about/in** hasarlamaq, divar arasına almaq; *The garden was walled in Bağ hasar içinə alınmışdı;* **to ~ off** divarla/hasarla ayırmaq, sədd çəkmək *(həm də məc.)*; *He was walled off from his friends by unconquerable shyness Qarşısıalınmaz utancaqlıq onunla dostları arasında sədd yaratmışdı;* **to ~ up** divar arasına qoyub hörmək; kip bağlamaq *(qapını, pəncərəni)*

**wallaby** [ˈwɔləbı] *n* 1. *zool.* kenquru *(kiçik)*; 2. *pl zaraf.* avstraliyalı

**Wal(l)ach** [ˈwɔlək] *n bot.* qarğagözü

**wallaroo** [.wɔləˈru:] *n zool.* kenquru *(iri)*

**wallboard** [ˈwɔ:l.bɔ:d] *n tik.* divar plitəsi, divar salı; quru mala/suvaq

**walled** [ˈwɔ:ld] *adj* divarla/hasarla əhatə olunmuş; **a ~ town** divarla əhatə olunmuş şəhər; **a ~ garden** hasarla əhatə olunmuş bağ, hasarlanmış bağ

**waller** [ˈwɔ:ləʳ] *n* bənna

**wallet** [ˈwɔlıt] *n* 1. bumajnik *(cib kisəsi, portmanat)*; 2. futlyar, qab, çexol, qutu *(alətlər və s. üçün)*; 3. *arx.* dağarcıq, yol çantası

**wall-eye** [ˈwɔ:laı] *n* 1. *tib.* titə, ağ *(göz qarasına düşən ağ ləkə)*; 2. titəli göz; göz qarasına ağ düşən göz; 3. dombalangözlük, dombalangöz

**wall-eyed** [ˈwɔ:laıd] *adj* 1. ağ ləkə düşən, titə gözlü, titəli; ləkəli; 2. çəpgöz, çəpgözlü; 3. dombalangöz *(xüs. balıqlar haqqında)*; 4. çox sərt, mərhəmətsiz, hiddətli, qəzəbli *(nəzər/baxış haq.)*; 5. *sl* sərxoş

**wallflower** [ˈwɔ:l.flauəʳ] *n* 1. *bot.* şəbbu gülü; 2. *d.d.* kavalersiz qalan xanım *(balda)*; 3. *dən. sl.* əməliyyatda iştirak etməyən gəmi

**wall-game** [ˈwɔ:lˈgeım] *n id.* futbolun bir növü

**Wallon¹** [wɔˈlu:n] *n* 1. Vallon; 2. *top.* i **the Wallons** vallonlar

**Wallon²** [wɔˈlu:n] *adj* Vallon, Vallona məxsus; **the ~ language** Vallon dili

**wallop¹** [ˈwɔləp] *n* 1. *d.d.* güclü zərbə; **to strike a ~** bərk zərbə vurmaq/endirmək; 2. səs-küy, gurultu, partıltı, şaqqıltı, gumbultu; **to fall /to go down with a ~** guppultu ilə yıxılmaq/düşmək

**wallop²** [ˈwɔləp] *v* 1. *d.d.* bərk vurmaq, güclü zərbə endirmək/vurmaq *(topa, düşmənə və s.)*; 2. *d.d.* darmadağın etmək *(rəqibi)*; *We walloped them 6:0 Biz onları 6:0 hesabı ilə məğlub/darmadağın etdik;* 3. ağır-ağır addım atmaq, ləngər vura-vura yerimək *(həm də* **to ~ along***)*; 4. bərk döymək *(ağacla)*; *My father used to wallop me if I told lies Mən yalan danışanda atam məni kötəkləyirdi*

**walloper** [ˈwɔləpəʳ] *n d.d.* nəhəng/yekə bir şey

**walloping¹** [ˈwɔləpıŋ] *n* 1. *d.d.* döymə, kötəkləmə, vurma; *She threatened the children with a walloping O, uşaqları döyməklə hədələdi;* 2. *d.d.* tam/ağır məğlubiyyət; *Our team got a real walloping yesterday Bizim komanda dünən ağır məğlubiyyətə uğradı*

**walloping²** [ˈwɔləpıŋ] *adj* 1. *d.d.* iri, yekə, böyük; *What a walloping lie! Necə də ağ yalan!* **a ~ collection** böyük kolleksiya; 2. ağır, ləng; 3. görkəmli, valehedici; **a new ~ production** valehedici təzə quruluş/tamaşa

**wallow¹** [ˈwɔlou] *n* 1. heyvanların ağnamaq yeri; gölməçə; 2. ağnama, bir böyründən o biri böyrü üstə çevrilmə; 3. çala, çuxur

**wallow²** [ˈwɔlou] *v* 1. ağnamaq *(suda, gölməçədə)*, bir böyründən o biri böyrü üstə çevrilmək; çapalamaq; çırpınmaq; *Pigs wallow in mud Donuzlar palçıqda ağnayır; The children were wallowing in the pool Uşaqlar çarhovuzda çapalayırdılar;* 2. ağır-ağır/yöndəmsiz yerimək/ hərəkət etmək; 3. *məc.* itib-batmaq, qərq olmaq, mübtəla olmaq; **to ~ in money/in luxury** pul /cah-calal içərisində itib-batmaq; **to ~ in grief** dərdə-qəmə mübtəla olmaq/batmaq; **to ~ in sin** günaha batmaq, günah içində itib-batmaq; 4. dalğada silkələnmək *(gəmi haq.)*; 5. qalxmaq, yuxarı qalxmaq *(tüstü, buğ, alov və s. haq.)*

**wall-painting** [ˈwɔ:l.peıntıŋ] *n* divar rəsmi, divar naqqaşlığı

**wall-paper** [ˈwɔ:l.peıpəʳ] *n* 1. divar kağızı; 2. divar qəzeti

**wall-pier** [ˈwɔ:lˈpıəʳ] *n mem.* pilyastr *(bir tərəfi divara bitişmiş dördkənarlı sütun)*

**wallscrew** [ˈwɔ:lˈskru:] *n tex.* dəmir bolt/bond

**wall shelter** [ˈwɔ:l.ʃeltəʳ] *n hərb.* yeraltı sığınacaq

**wall-stone** ['wɔ:lstoun] *n* tikinti/divar daşı
**Wall Street** ['wɔ:l'stri:t] *n* 1. Voll-Strit *(ABŞ maliyyə təşkilatlarının – iri bankların, birjaların Nyu-Yorkda yerləşdiyi küçə)*; 2. *məc.* Amerika maliyyə oliqarxiyası
**walnut** ['wɔ:lnət] *n* 1. *bot.* qoz; 2. qoz ağacı; 3. qoz ağacı oduncağı; a ~ **table** qoz ağacından qayrılmış/ düzəldilmiş stol; ~ **furniture** qoz ağacından qayrılmış/düzəldilmiş mebel;
◊ **over the ~s and the wine** *zaraf.* çərəz yeyilən zaman, çərəz zamanı *(stolun arxasında ancaq kişilər qalan vaxt)*
**walnut-tree** ['wɔ:lnət.tri:] *n* = **walnut** *(2-ci mənada)*
**walrus** ['wɔ:lrəs] *n* 1. *zool.* morj *(məməli dəniz heyvanı)*; 2. *d.d.* uzun sallaq bığlar *(morjdakı kimi) (həm də* ~ **moustache)**
**waltz[1]** ['wɔ:ls] *n* vals *(rəqs)*; **to ask *smb.* for a ~** bir kəsi valsa dəvət etmək
**waltz[2]** ['wɔ:ls, wɔ:lts] *v* 1. vals oynamaq; *Will you waltz with me? İcazə ver/verin, səni/sizi valsa dəvət edim; Mənimlə vals oynayarsanmı?/ oynayarsınızmı?*; 2. oynamaq, atlanıb düşmək *(sevincdən, həyəcandan)*; 3. girmək; soxulmaq; **to ~ into/out of a room** rəqs edə-edə otağa girmək/ otaqdan çıxmaq; *I don't like him waltzing into the house as if he owned it Onun ev sahibi kimi evə soxulmağını xoşlamıram*; 4. *amer. zaraf.* sürümək, aparmaq *(nə isə ağır bir şeyi)*; *He had to waltz this box all over the yard O, bu qutunu bütün həyət boyunca sürüməli oldu; He grabbed the child's arm and waltzed him upstairs O, uşağın qolundan yapışdı və onu pilləkənlərlə sürüyə-sürüyə yuxarı apardı*; **to ~ off** yaxalamaq; *The police waltzed him off to jail Polis onu yaxalayıb həbsxanaya apardı*
**wamble[1]** ['wɔmbl] *n dial.* 1. ləngər/valay vurma, valaylama, səndələyə-səndələyə yerimə; 2. tərpənmə, çevrilmə, o yan-bu yana dönmə *(şey haq.)*; 3. ürəyi bulanma
**wamble[2]** ['wɔmbl] *v dial.* 1. ləngər vurmaq, valay vurmaq, valaylamaq, səndələyə-səndələyə yerimək; 2. tərpənmək, o yan-bu yana dönmək/ çevrilmək, çevirmək, döndərmək *(əşyanı)*; 3. *arx.* ürəyi bulanmaq; 4. quruldamaq *(qarın)*
**wamus** ['wɔməs] *n amer.* 1. hörmə jaket *(yaxalıqsız)*; 2. kobud, qaba yundan tikilən gödəkçə
**wan[1]** [wɔn] *adj* 1. solğun, rəngi qaçmış; üzgün, tabsız, taqətsiz; *His face was wan and drawn Onun rəngi qaçmış və sifəti dartılmışdı*; a ~ **smile** üzgün/yorğun təbəssüm; 2. *məc.* tutqun, zəif, bozarmış; ~ **light** zəif/tutqun işıq; ~ **sky** tutqun səma; 3. *arx.* tünd, qara
**wan[2]** [wɔn] *v* 1. rəngi qaçmaq, tutqunlaşmaq; taqətsizləşmək; 2. üzmək, taqətdən salmaq, yormaq; 3. bozarmaq, tutqunlaşmaq
**wand** [wɔnd] *n* 1. nazik çubuq; 2. dirijor çubuğu; 3. sehrli çubuq; *The godmother waved her wand Xaç anası sehrli çubuğunu yellədi*; 4. *arx.* hökmdar əsası

**wander[1]** ['wɔndə^r] *n* dolaşma, gəzmə, veyllənmə, avara-avara gəzmə; səyahət etmə, diyarbədiyar gəzmə
**wander[2]** ['wɔndə^r] *v* 1. dolaşmaq, gəzmək; veyllənmək, avara-avara gəzmək; səyahət etmək, diyarbədiyar gəzmək; *We wandered around for hours looking for the house Ev axtarışında bir saatlarla ətrafı dolaşdıq*; **to ~ in the forest** meşədə dolaşmaq; **to ~ up and down aimlessly** məqsədsiz olaraq dolaşmaq/veyllənmək; **to ~ from place to place** sərsəri həyat keçirmək; **to ~ over *(through, about)* the world** bütün dünyanı dolaşmaq/səyahət etmək; 2. gəzmək, yayılmaq, dolaşmaq *(fikir, xəyal, şayiə və s.)*; *His mind was wandering Onun xəyalı /fikirləri dolaşırdı; His thoughts wander Onun düşüncələri gəzir/dolaşır; Strange whispers wandered about the camp Düşərgədə qəribə şayiələr gəzdi/dolaşdı*; 3. **(to, from)** *məc.* ayrılmaq, uzaqlaşmaq, fikri yayınmaq; *Don't wander from the point/subject Mövzudan uzaqlaşma/uzaqlaşmayın*; 4. sərsəmləmək, sayıqlamaq; *His mind is wandering O sərsəmləyir*; 5. azmaq, yolu itirmək; **to ~ out of *one's* way/off the track/from a path** yolunu azmaq/itirmək; **to ~ from a course** marşrutdan çıxmaq; 6. burulmaq, qıvrılmaq, getmək *(çay, yol və s.)*; **to ~ about** veyllənmək, dolaşmaq *(məqsədsiz)*; **to ~ away** getmək və yolu azmaq; geri qalmaq *(sürüdən və s.)*; *Some of the sheep have wandered away Bir neçə qoyun sürüdən geri qalmışdı*; **to ~ forth** baş alıb getmək; **to ~ in** azıb gəlmək, təsadüfən içəri girmək; **to ~ off** çıxıb getmək; **to ~ off from *one's* home/*one's* friends** öz evini/dostlarını qoyub getmək
**wandering[1]** ['wɔndərıŋ] *n* 1. veyllənmə, dolaşma *(məqsədsiz)*; 2. *pl* səyahət, səyahət etmə *(dünyanı)*; 3. *pl* sayıqlama, sərsəmləmə, rabitəsiz nitq *(xüs. yüksək qızdırma vaxtı)*
**wandering[2]** ['wɔndərıŋ] *adj* 1. dolaşan, veyllənən, gəzən, avaralanan; ~ **minstrels** gəzən çalğıçılar *(diyarbədiyar)*; 2. qıvrılan, burulan *(çay, yol və s. haq.)*; 3. *tib.* azan; ~ **kidney** böyrək *(normal yerini dəyişmiş)*; 4. köçəri *(tayfalar)*; 5. sürünən *(bitki haq.)*
**wanderlust** ['wɔndəlʌst] *n* səyahət sevgisi/həvəsi /marağı
**wane[1]** [weın] *n* 1. kiçilmə, incəlmə *(ay haq.)*; **to be on/upon the ~** getdikcə incəlmək/kiçilmək; 2. azalma, seyrəkləşmə *(meşə)*; 3. tənəzzül etmə, zəifləmə; *His power is on the wane Onun hakimiyyəti zəifləyir/tənəzzül edir; The day was in its wane Gün qurtarmaq üzrə idi*
**wane[2]** [weın] *v* 1. kiçilmək, incəlmək *(ay haq.)*; 2. azalmaq, əskilmək; zəifləmək, zəif olmaq; *His strength /influence/reputation is waning Onun gücü/təsiri/nüfuzu azalmaqdadır/zəifləməkdədir*; 3. sona çatmaq, qurtarmaq; *The day wanes Gün qurtarır*



**wangle[1]** ['wæŋgl] *n d.d.* biclik, kələk; aldatma; **to get *smth.* by a ~** bir şeyi kələklə/bicliklə əldə etmək
**wangle[2]** ['wæŋgl] *v d.d.* 1. bir şeyi kələklə/aldatma yolu ilə əldə etmək; bicliklə çətin vəziyyətdən çıxa bilmək; **to ~ a few days' extra leave** bicliklə bir neçə günlük əlavə məzuniyyət almaq; **to ~ an invitation** üz vurmaqla/vadar etməklə dəvət əldə etmək; 2. təsir/məcbur etmək, bir kəsi bir işə çəkib salmaq; dilə tutaraq bir şey qopartmaq; *I'll come if I can wangle some money out of my parents Valideynlərimdən bir az pul qoparda bilsəm, gələrəm*; 3. faktları təhrif etmək; **to ~ statistics** statistik məlumatları təhrif etmək
**want[1]** [wɔnt] *n* 1. *(adət. pl)* tələbat, istək, arzu; *He is a man of few wants O, aza qane olan adamdır; My wants are few Mənim tələbatım azdır; We can supply all your wants Biz sənin/sizin bütün tələbatlarını/tələbatlarınızı təmin edə bilərik; The hotel staff saw to all our wants Mehmanxana işçiləri bizim bütün tələbatlarımızı yerinə yetirdilər*; 2. **(of, for, from)** çatışmamazlıq, ehtiyac; a ~ **of food and medical supplies** ərzaq və tibbi ləvazimat çatışmamazlığı; *The plants died from want of water Bitkilər su çatışmamazlığından məhv oldu*; ~ **of common sense** sağlam fikir çatışmamazlığı; *There is want of confidence in him O, özünə arxayın deyil*; ~ **of appetite** iştahanın olmaması; *Our house is in want of repair Evimizin təmirə ehtiyacı var*; 3. ehtiyac, kasıblıq, yoxsulluq; **to live in ~** ehtiyac içərisində yaşamaq; *They had lived all their lives in want Onlar bütün həyatlarını kasıbçılıq içərisində keçiriblər/yaşayıblar; Their health had suffered from years of want Onların səhhəti uzun illərin kasıbçılığından pozulmuşdu*
**want[2]** [wɔnt] *v* 1. istəmək, arzu etmək; *She wants to learn the Azerbaijan language O, Azərbaycan dilini öyrənmək istəyir; She wants to go to England O, İngiltərəyə getmək istəyir; I want a drink Mən içiki istəyirəm; Do you want to go now? Sən/Siz indi getmək istəyirsənmi?/istəyirsinizmi?; Ask him what he wants Ondan nə istədiyini soruş/soruşun*; 2. tələb etmək, lazım olmaq; *Your hair wants cutting Sənin/Sizin saçını/saçınızı kəsdirmək lazımdır; These plants are drooping – they want water Bu bitkilər soluxur/ölgünləşir – onlar su tələb edir/onlara su lazımdır; You are wanted on the telephone Səni/Sizi telefona çağırırlar; He is wanted by the police Onu polis axtarır*; 3. ehtiyacında olmaq *(bir şeyin)*, lazım olmaq *(bir şey)*; *That is all I want Mənə lazım olan budur; Let him want for nothing Qoy o, ehtiyac nə olduğunu bilməsin; You want to see a doctor Sənə/Sizə həkimə getmək lazımdır; You badly want a new hat Sənə/Sizə təzə şlyapa çox lazımdır; It wants to be done with great care Bunu çox ehtiyatla etmək lazımdır; My shoes want repairing Mənim ayaqqabılarımı təmir etmək lazımdır*; 4. çatışmamaq; *The book wants three pages at the end Kitabın sonunda üç səhifə çatışmır; It wants five minutes to six Altıya beş dəqiqə qalır*; **to ~ in** *d.d.* içəri girmək istəmək; *The dog wants in – it's scratching at the door İt içəri girmək istəyir – o, qapını cırmaqlayır*; **to ~ out** *d.d.* bayıra çıxmaq istəmək; *He told them that he wanted out (of the gang) O onlara dedi ki, o, quldur dəstəsindən çıxmaq istəyir; The dog wants out İt bayıra çıxmaq istəyir*
**want ad** ['wɔnt'æd] *n amer. d.d.* qısa elan *(qəzetin təklifləri və sorğu hissəsində)*
**wantage** ['wɔntıdʒ] *n* çatışmazlıq
**wanted** ['wɔntıd] *adj* 1. *d.d.* polis tərəfindən axtarılan; *Wanted for murder Qətlə görə axtarılır*; 2. tələb olunan, gərək/lazım olan; *Wanted a cook for a small family Kiçik bir ailəyə aşpaz lazımdır*
**wanting[1]** ['wɔntıŋ] *adj* 1. ehtiyacı olan *(bir şeyə)*; bir şeyi olmayan; ~ **in initiative** təşəbbüsə ehtiyacı olan; ~ **in courtesy** ədəbsiz, hörmətsiz, nəzakətsiz; ~ **in skill/experience** bacarığı/təcrübəsi olmayan; bacarıqsız, təcrübəsiz; *He is not wanting in intelligence O, zəkalıdır/ağıllıdır*; 2. çatışmayan, əskik; **a coat with some buttons ~** bir neçə düyməsi əskik olan palto; **a month ~ two days** bir aydan iki gün əskik; 3. gicbəsər, ağıldan kəm, gictəhər; *He seems to be slightly wanting Məncə, o bir qədər ağıldan kəmdir*
**wanting[2]** ['wɔntıŋ] *prep* -sız, -siz, -suz, -süz; olmadan; **a book ~ a cover** cildsiz kitab; *Wanting mutual trust, friendship is impossible Qarşılıqlı inam olmadan, dostluq mümkün deyildir; Wanting energy nothing can be done Güc sərf etmədən heç bir şey etmək olmaz*
**wanton[1]** ['wɔntən] *n* fahişə, qəhbə, əxlaqsız/pozğun qadın
**wanton[2]** ['wɔntən] *adj* 1. özbaşına, məsuliyyətsiz; mənasız; səbəbsiz; ~ **cruelty** səbəbsiz amansızlıq/qəddarlıq; ~ **attack** səbəbsiz hücum; ~ **insult** səbəbsiz təhqir; **the ~ destruction of a historic building** tarixi binanın səbəbsiz uçurulması; 2. pozğun, əxlaqsız; **a ~ woman** pozğun/əxlaqsız qadın; 3. mənfur, çirkin; ~ **thoughts** çirkin/mənfur fikirlər; 4. *şair.* şux, oynaq; şıltaq, öz bildiyini edən; **in a ~ mood** şux/oynaq əhvali-ruhiyyədə; 5. *şair.* coşğun, gur, şiddətli *(inkişaf, böyümə və s. haq.)*; ~ **growth** gur inkişaf; 6. *məc.* zəngin, qeyri-adi, çox qəribə, qəşəng; ~ **speech** qeyri-adi nitq; ~ **imagination** zəngin/qeyri-adi təxəyyül; ~ **dress** qəşəng/şıq paltar
**wanton[3]** ['wɔntən] *v* 1. pozğunluq/əxlaqsızlıq etmək; 2. sıx/gur qol-budaq atmaq, böyümək, şaxələnmək; 3. *şair.* oynamaq; fırlanmaq; *The leaves wanton in the wind Yarpaqlar küləkdə*

*firlanır*; 4. puç etmək, israf etmək, səmərəsiz sərf etmək; **to ~ away one's life** həyatını puç etmək; 5. vəhşilik etmək; zor işlətmək

**wantonly** ['wɔntənlı] *adv* 1. məqsədsiz; mənasızca; ~ **wasting time** vaxtı mənasızcasına keçirmə/itirmə; 2. heç bir səbəb olmadan; **to insult smb.** ~ heç bir səbəb olmadan bir kəsi təhqir etmək

**wapiti** ['wɔpıtı] *n zool.* vapiti *(Kanada maralı)*

**war¹** [wɔ:] *n* 1. müharibə; **civil** ~ vətəndaş müharibəsi; **cold** ~ soyuq müharibə; **atomic/ nuclear** ~ atom/nüvə müharibəsi; **ideological** ~ ideoloji müharibə; **to be at** ~ müharibə vəziyyətində olmaq; *Azerbaijan and Armenia are at war now İndi Azərbaycan və Ermənistan müharibə vəziyyətindədir*; ~ **of extermination** soyqırım müharibəsi; **to go to** ~ müharibəyə getmək; **to begin/to declare** ~ müharibə başlamaq/elan etmək; **to win/to lose** ~ müharibəni udmaq/ uduzmaq; **to wage** ~ **on smb.** bir kəslə müharibə etmək/ aparmaq; **Council of War** Hərbi Şura; **Art of War** hərb sənəti; **The Great Patriotic War** Böyük Vətən müharibəsi; (1941-1945); **The First World War, World W I** Birinci Dünya müharibəsi (1914-1918); **World W. II** İkinci Dünya müharibəsi (1939-1945); **a prisoner of** ~ hərbi əsir; **to end** ~ müharibəyə son qoymaq, müharibəni qurtarmaq; ~ **of Independence, Revolutionary W.** *amer. tar.* Müstəqillik uğrunda müharibə (1775-1783); **to fan/to stir up/to incite** ~ müharibəni qızışdırmaq; 2. mübarizə; düşmənçilik; ~ **between man and nature** insanla təbiət arasında mübarizə; ~ **against illiteracy/disease** savadsızlığa/ xəstəliyə qarşı mübarizə; ~ **of words** söz güləşdirmə; **to have** ~ **in one's heart** ürəyində düşmənçilik hissi bəsləmək; **the class** ~ sinfi mübarizə; **a trade** ~ ticarət mübarizəsi; 3. *şair.* silah; ordu; döyüş

**war²** [wɔ:] *adj* hərbi, müharibə; ~ **budget** hərbi büdcə; ~ **build-up** *d.d.* hərbi hazırlıq; ~ **cabinet** hərbi kabinet; ~ **college** hərbi kollec; ~ **criminals** hərbi cinayətkarlar; ~ **cripple** müharibə əlili; ~ **debts** hərbi borclar; ~ **fever** *tib.* qarın yatalağı, tif; ~ **focus** müharibə ocağı; ~ **seat** hərbi əməliyyatların getdiyi yer; ~ **hawk** *amer.* müharibə qızışdıran; ~ **honours** döyüşdə fərqlənmə nişanı; **War House** *d.d.* Hərbi Nazirlik; **on a ~ footing** döyüşə hazır olma; **a ~ prisoner** hərbi əsir; ~ **surgery** hərbi səhra cərrahiyyəsi; ◊ ~ **to the knife** ölüm-dirim müharibəsi; **private** ~ qan düşmənçiliyi; **to carry the ~ into the enemy's country 1)** müharibəni düşmən ərazisinə keçirmək; 2) hücuma keçmək *(mübahisədə)*

**warble¹** ['wɔ:bl] *n* 1. cəh-cəh, zəngulə *(quş)*; **the ~ of a nightingale** bülbülün cəh-cəhi; 2. səs, cingilti; **the ~ of a telephone** telefon səsi/cingiltisi; 3. *şair.* şırıltı, şırıltı ilə axma *(bulaq və s. haq.)*

**warble²** ['wɔ:bl] *v* 1. cəh-cəh vurmaq; nəğmə oxumaq, cikkildəmək *(quş haq.)*; 2. şırıltı ilə axmaq, şırıldamaq *(bulaq və s.)*

**warbler** ['wɔ:blə^r] *n* cəh-cəh vuran quş, çalıquşu

**war-cloud** ['wɔ:klaud] *n* müharibə buludları, müharibə ərəfəsindəki vəziyyət, müharibəqabağı şərait

**war-cry** ['wɔ:kraı] *n* müharibə çağırışı, müharibə şüarı; şüar; *"Equal Rights for Women!" was their war-cry "Qadınlar üçün bərabər hüquq!" onların şüarı idi*

**ward¹** [wɔ:d] *n* 1. palata *(xəstəxanada)*; **a children's/ maternity/surgical** ~ uşaq/doğum/ cərrahiyyə palatası; **a public/private** ~ ictimai/şəxsi palata; 2. kamera *(həbsxanada)*; **condemned** ~ ölüm cəzasına məhkum edilmişlər üçün kamera; 3. şəhərin inzibati rayonu; *There are three candidates standing for election in this ward Şəhərin bu inzibati rayonundan seçilmək üçün üç namizəd vardır*; 4. qəyyumluq, himayə; **to be in** ~ himayə altında olmaq; **a child in** ~ qəyyumluğa götürülmüş uşaq; **Court of ~s** *tar.* qəyyumluq məsələsi üzrə məhkəmə; **a person in** ~ himayədə olan şəxs; *The child was made a ward of court Uşaq qəyyumluq məhkəməsinin nəzarətində idi*; 5. qəyyum; *Everyone was shocked when he married his young ward O öz gənc qəyyumuna evlənəndə hamı sarsıldı*; 6. *arx.* keşikçi/qarovul mühafizə dəstəsi; **to keep/to hold** ~ mühafizə etmək, keşiyini/ qarovulunu çəkmək

**ward²** [wɔ:d] *v* 1. qabağını almaq, dəf etmək, qaytarmaq *(zərbəni, təhlükəni və s.: adət.* **to ~ off**); **to ~ off a blow/a danger** zərbəni/təhlükəni dəf etmək; 2. xəstəxana palatasına yerləşdirmək/ qoymaq

**warden** ['wɔ:dn] *n* 1. rəis; rektor, direktor *(bəzi ingilis kolleclərində)*; **The Warden of Merton College, Oxford** Oksfordun Merton kollecinin rektoru; 2. qubernator, yüksək vəzifəli şəxs; 3. həbsxana nəzarətçisi/rəisi, nəzarətçi; 4. baş rahib *(kilsədə)*; 5. xidmətçi, qulluqçu; 6. *arx.* keşikçi, növbətçi, qarovul; **air-raid** ~ yerli hava hücumundan mühafizə müvəkkili

**warder** ['wɔ:də^r] *n* 1. dustaqxana gözətçisi, zindanban; 2. *arx.* keşikçi, növbətçi, qarovul; 3. hökmdə əsas, hakimiyyət rəmzi

**war-dog** ['wɔ:dɔg] *n* 1. *hərb.* xidmət iti; 2. *məc.* təcrübəli, oddan-alovdan keçmiş əsgər; 3. *amer.* müharibə qızışdıran, militarist

**Wardour Street English** ['wɔ:dəstri:t'ıŋglıʃ] *n* köhnəlmiş sözlərlə dolu olan ingilis nitqi

**wardress** ['wɔ:drıs] *n* dustaqxana gözətçisi *(qadın)*, zindanban *(qadın)*

**wardrobe** ['wɔ:droub] *n* 1. qarderob, paltar şkafı; **convenient** ~ əlverişli qarderob; **a spacious** ~ tutumlu paltar şkafı; *She has a wardrobe full of dresses Onun paltarla dolu qarderobu var*; 2. qarderob otağı, paltar saxlanılan yer; 3. bir adamın və ya ailənin bütün paltarları



**wardrobe mistress** ['wɔ:droub'mıstrıs] *n* paltarsaxlayan qadın, qarderobçu

**wardrobe-trunk** ['wɔ:droub'trʌŋk] *n* şkaf kimi açılan yekə sandıq

**ward-room** ['wɔ:drum] *n* 1. *dən.* kayut-kampaniya *(gəmidə komanda heyətinin yeyib-içməsi və istirahəti üçün ümumi otaq)*; 2. **(the ~)** *top. i* gəminin zabit heyəti; 3. qarovul otağı

**war drum** ['wɔ:'drʌm] *n* müharibə təbili; müharibəyə çağırış, müharibənin başlanmasını xəbər verən siqnal

**wardship** ['wɔ:dʃıp] *n hüq.* qəyyumluq, himayə, hamilik; *He is under the wardship of me O mənim himayəmdədir*

**ware** [weə^r] *n* 1. *top.i Tək və cəmdə işlənir*; mal, əmtəə, əşya; **soft** ~ parçalar, toxuma mallar; **foreign ~s** xarici mallar; **to display one's ~s** mallarını nümayiş etdirmək/yerləşdirmək; 2. məmulat, dulusçuluq məmulatı; **silver** ~ gümüş məmulatı; **earthen** ~ dulusçuluq məmulatı, keramika; **potter's** ~ dulusçuluq məmulatı; **iron** ~ dəmir məmulatı; **to advertise/to display/to sell one's ~s** məmulatları reklam etmək/nümayiş etdirmək/satmaq

**war eagle** ['wɔ:r,i:gl] *n zool.* berkut *(qartal cinsindən yırtıcı quş)*

**warehouse¹** ['weəhaus] *n* 1. anbar; **customs** ~ gömrük(xana) anbarı; 2. böyük dükan/mağaza, topdansatış dükanı; ~ **certificate** *amer.* anbar vəsiqəsi/şəhadətnaməsi

**warehouse²** ['weəhaus] *v* 1. anbara yığmaq, anbarda saxlamaq; anbara vurmaq; 2. saxlamağa vermək *(xüs. mebeli)*

**warehouse-keeper** ['weəhaus,ki:pə^r] *n* anbardar, anbar sahibi, anbar rəisi; **~'s certificate /receipt** anbar vəsiqəsi

**warehouseman** ['weəhausmən] *n (pl* **-men** [-mən]) 1. anbarçı, anbardar; anbarda işləyən/xidmət edən fəhlə/xidmətçi; 2. anbar sahibi; 3. topdansatış taciri *(xüs. toxuculuq malları)*

**wareroom** ['weərum] *n* 1. anbar, anbar otağı; 2. sərgi salonu

**warfare** ['wɔ:feə^r] *n* 1. *hərb.* müharibə; müharibə aparma qaydası/üsulu; **to conduct** ~ döyüş əməliyyatı aparmaq; **bacterial** ~ bakterioloji müharibə; **guerilla/nuclear** ~ partizan/nüvə müharibəsi; 2. toqquşma, vuruşma, döyüş, mübarizə; *There is open warfare between the opponents of the new road scheme Yeni yol proyekti/ layihəsi üzrə opponentlər arasında açıq-aydın fikir ayrılığı vardır*

**war-game** ['wɔ:geım] *n* hərbi oyun

**war-god** ['wɔ:gɔd] *n* müharibə Allahı; Mars, Ares *(yunan əsatirində)*

**war-head** ['wɔ:hed] *n* döyüş başlığı; döyüş cihazının uc hissəsi

**war-horse** ['wɔ:hɔ:s] *n* 1. *tar.* döyüş atı; 2. müharibə veteranı; təcrübəli qoca əsgər/siyasi xadim

**warily** ['weərılı] *adv* ehtiyatla, ehtiyatkarlıqla

**wariness** ['weərınıs] *n* ehtiyatlılıq, ehtiyatkarlıq, ehtiyat

**war-jittery** ['wɔ:,dʒıtərı] *adj* 1. müharibə psixozuna mübtəla olan; 2. müharibə həddində olan; ~ **situation** *hərb. d.d.* müharibəqabağı/müharibə ərəfəsində olan vəziyyət; müharibə olacağını təhdid edən vəziyyət

**warlike** ['wɔ:laık] *adj* 1. davakar; mübariz; cəngavər; ~ **tribe** davakar/cəngavər qəbilə; ~ **politicians** mübariz siyasətçilər; **a ~ gesture** *məc.* qılınc oynatma, meydan oxuma; *He entered the meeting in a warlike frame of mind O, iclasa davakar bir tərzdə girdi*; 2. hərbi; ~ **equipment** hərbi ləvazimat, hərbi texnika

**warlock** ['wɔ:lɔk] *n arx.* cadugər, sehrbaz, ovsunçu *(qadın)*

**war-lord** ['wɔ:lɔ:d] *n* 1. sərkərdə, qoşun başçısı; 2. hərbi diktator; iri hərbi sənaye sahibi

**warm¹** [wɔ:m] *n d.d.* isitmə, qızdırma; **to have a ~** isinmək, qızınmaq; **to give a ~** isitmək, qızdırmaq; *I must give the milk a warm Südü qızdırmalıyam*

**warm²** [wɔ:m] *adj* (-er, -est) 1. isti, ılıq; mülayim; ~ **milk/coffee** isti/ılıq süd/kofe; ~ **day/weather** mülayim/isti gün/hava; **a ~ iron** isti ütü; **a ~ month** isti ay; ~ **water** ılıq su; *It was warm but not hot, yesterday Dünən hava isti yox, mülayim idi; I am warm, I feel warm Mənə istidir; I can't get warm Mən qızına bilmirəm*; ~ **countries** isti ölkələr; ~ **clothing/dress** isti paltar; *This sweater is warm enough Bu sviter kifayət qədər istidir; Put on your warmest clothes before you go out to play in the snow Qarda oynamağa getməzdən əvvəl isti paltarlarını geyin/geyinin*; 2. *məc.* tez qızışan, tez özündən çıxan; alışıb-yanan; coşan; isinən; ~ **with wine/battle** şərabın/döyüşün təsirindən coşan/tez özündən çıxan; eyes ~ **with hatred /indignation** nifrətdən/qəzəbdən alışıb-yanan gözlər; **heart ~ with love** sevgidən coşan ürək; 3. səmimi, dostcasına, mehriban *(qəbul və s.)*; ~ **reception** səmimi/mehriban/dostcasına qəbul; ~ **meeting** mehriban görüş; ~ **heart** həssas ürək; ~ **thanks** qızğın təşəkkür; **to be ~ friends** səmimi /mehriban dost olmaq; ~ **in manner** xoşrəftar, iltifatlı; *She is a warm and sympathetic person O, mehriban və suyuşirin şəxsdir/qadındır*; 4. atəşin, coşğun, hərarətli, ehtiraslı; ~ **imagination** coşğun təxəyyül; ~ **blood** dəliqanlı, qızğın, coşğun; **to do smth. in ~ blood** bir şeyi qızışaraq /düşünmədən/ hirslənərək etmək; **to give ~ support** to **smb./smth.** bir kəsə/şeyə bərk (atəşin) tərəfdar olmaq; 5. əsəbi, tünd, tündməcaz, tündxasiyyət; hirsli, tez özündən çıxan; ~ **temper** tünd xasiyyət; **to have ~ words with smb.** bir kəslə hirsli/əsəbi/kəskin danışmaq; 6. *rəs.* isti *(rəng haq.)*; *Red, yellow and orange are called warm colours Qırmızı, sarı və narıncı isti rənglər adlanır*; 7. *ovç.* təzə *(iz haq.)*;

◊ ~ **language/words** *amer. sl.* yağlı söyüş/sözlər; ~ **work** 1) gərgin iş *(fiziki)*; 2) qorxulu/təhlükəli iş; 3) kəskin mübarizə; **a ~ corner** təhlükəli/qorxulu yer *(döyüşdə və s.)*; **to make things ~ for** ***smb.*** anasından əmdiyini burnundan gətirmək

**warm[3]** [wɔ:m] *v* **1**. qızdırmaq, qızmaq, isitmək; istilətmək, istiləndirmək *(həm də* **to ~ up)**; **to ~ *one's* hands by the fire** əlini ocaqda qızdırmaq; *Please, warm (up) this milk Zəhmət olmasa, bu südü qızdır/qızdırın; The milk is warming up on the stove Süd peçin üstündə qızır*; **2**. isinişmək, ürəyi yatmaq, öyrəşmək *(bir şeyə, bir kəsə)*; *I warmed to her immediately Mən dərhal ona isinişdim; He's not somebody one warms to easily O elə adam deyil ki, ona asanlıqla isinişəsən*; **3**. şövqə gəlmək, qızışmaq, qızmaq; ilhamlandırmaq, ürəkləndirmək; ürəklənmək, ruhlanmaq *(adət.* **to ~ to/towards)**; *He warmed up as he went on with his speech O danışdıqca şövqə /ilhama gəlirdi*; **to ~ *one's* heart** ruhlandırmaq, ürəyinə təskinlik vermək, ürəkləndirmək; *He warmed up the audience by telling a few jokes before the show began Tamaşa başlamazdan əvvəl o bir neçə gülməli əhvalat söyləməklə tamaşaçıları canlandırdı*; **to ~ to *one's* work/task, *etc*.** işindən/vəzifəsindən və s. ilham almaq, işini/vəzifəsini və s. sevmək; **to ~ up** 1) isitmək, qızdırmaq; istilətmək; qızmaq; *Warm up the car before you drive off! Maşını sürməmişdən əvvəl qızdır/qızdırın*; 2) şövqə gətirmək, ürəkləndirmək, canlandırmaq, ruhlandırmaq, ilhama gətirmək; ruhlanmaq; qızışmaq, qızışdırmaq; 3) *id.* oynatmaq, tərpətmək, açılışmaq, keyləşməyə qoymamaq *(əl-qolun, bədənin açılışması üçün edilən hərəkətlər)*; *After a warm-up period of five minutes, the game began Beş dəqiqəlik məşqdən sonra, oyun başladı*

**warm-blood** [ˈwɔ:mˌblʌd] *n zool.* məməlilər və quşlar

**warm-blooded** [ˈwɔ:mˌblʌdɪd] *adj* **1**. *zool.* istiqanlı heyvanlar; **2**. *məc.* tez qızışan, tez özündən çıxan; coşğun, qızğın *(adam haq.)*

**warmer** [ˈwɔ:məʳ] *n* **1**. qrelka *(içinə isti su tökülüb bədənin ağrıyan yerinə qoyulan rezin qovuq və s.)*; **2**. qızdırıcı, isidici cihaz;

◊ **bench ~** sərsəri, avara *(parkın skamyasında gecələyən)*

**warm-hearted** [ˈwɔ:mˈha:tɪd] *adj* səmimi, mehriban, istiqanlı, mərhəmətli, ürəyiyumşaq; **a ~ offer of help** səmimi kömək təklifi

**warm-house** [ˈwɔ:mˌhaus] *n* istixana, örtülü şitillik, şüşəbənd, oranjereya *(bitki yetişdirmək üçün isti yer)*

**warming** [ˈwɔ:mɪŋ] *n* **1**. isitmə, qızdırma; **2**. *sl.* kötək, kötəkləmə, döymə, əzişdirmə

**warming-pan** [ˈwɔ:mɪŋˈpæn] *n* **1**. qrelka *(yorğan-döşəyi qızdırmaq üçün metal cihaz)*; **2**. *sl.* müvəqqəti müavin

**warming-up** [ˈwɔ:mɪŋˈʌp] *n* **1**. *id.* əl-qolun, bədənin açılışması üçün edilən hərəkətlər; **2**. *tex.* qızma *(cihaz və s.)*

**warmish** [ˈwɔ:mɪʃ] *adj* istitəhər, bir az isti, ılıq

**war-monger** [ˈwɔ:mʌŋgəʳ] *n* **1**. müharibə qızışdıran; **2**. *tar.* muzdla tutulan əsgər

**warmth** [wɔ:mθ] *n* **1**. istilik; mülayimlik; **the ~ of the sun/of the fire** günəşin/ocağın istiliyi; **2**. səmimilik, istiqanlılıq; **pleased with the ~ of his welcome** ona göstərilən səmimi qəbuldan məmnun olan/qalan; **the ~ of his feelings** onun hisslərinin səmimiliyi/istiqanlılığı; **3**. vəcd, şövq, qızğınlıq, coşğunluq *(bir şeyə)*; *The matter was taken up with unexpected warmth İşə gözlənilməz bir vəcdlə/ coşğunluqla girişdilər*; **to reply with some ~** bir qədər hövsələsiz/hirsli cavab vermək; **4**. isti rənglər

**warn** [wɔ:n] *v* **1**. xəbərdarlıq etmək; *I tried to warn him, but he wouldn't listen Mən ona xəbərdarlıq etməyə çalışdım, amma o, qulaq asmadı; He was warned of the danger Ona təhlükə haqqında xəbərdarlıq edildi; We warned them not to go skating on such thin ice Biz onlara belə nazik buz üzərində konki ilə sürüşməmək haqqında xəbərdarlıq etdik; He warned us against pick-pockets O bizə xəbərdarlıq etdi ki, cibgirlərdən qorunaq*; **2**. **(against)** çəkindirmək, saqındırmaq; *The doctor warned him against working too hard Həkim onu çox işləməkdən çəkindirdi; His doctor has warned him off (drinking) alcohol Həkimi onu spirtli içki içməkdən çəkindirdi*; **3**. qabaqcadan xəbərdar edilmək *(rəsmi şəkildə)*; *The guide warned us that it was time to pack out things and be ready for departure Bələdçi bizə xəbərdarlıq etdi ki, şeylərimizi qablaşdırıb yola düşmək üçün hazır olaq; The farmer warned us off (his land) when we tried to camp there Biz orada düşərgə salmaq istəyəndə, fermer bizə xəbərdarlıq etdi ki, onun torpağından çıxıb gedək*; **4**. **(to, for)** *hərb.* çağırmaq, gəlmək haqqında xəbərdar etmək; **to ~ to duty** növbətçi təyin etmək; **to ~ to a place** bir yerə çağırmaq; *Officers and men were warned for guard Zabitləri və əsgərləri qarovula çağırdılar*

**warning[1]** [ˈwɔ:nɪŋ] *n* **1**. xəbərdarlıq, xəbərdar etmə; saqındırma, çəkindirmə; *He gave me a warning of the coming danger O mənə gələcək təhlükə haqqında xəbərdarlıq etdi; He paid no attention to my warnings O mənim xəbərdarlığıma əsla əhəmiyyət vermədi; Let this be a warning to you Qoy bu sənə/sizə xəbərdarlıq olsun; The enemy, attacked without warning Düşmən xəbər vermədən hücuma keçdi*; **2**. işarə, əlamət *(ola biləcək bir şey haq.)*, siqnal; *There were gale warnings to shipping along the coast Sahil boyunca gəmilər üçün fırtına işarələri var idi*; **3**. işdən getmə/çıxarılma haqqında



qabaqcadan edilən xəbərdarlıq; **to give a month's ~** bir ay qabaqcadan xəbərdarlıq etmək; **4**. *hərb.* siqnal, xəbərdarlıq işarəsi

**warning[2]** [ˈwɔ:nɪŋ] *adj* xəbərdaredici; saqındırıcı, çəkindirici; *He gave me a warning look O mənə saqındırıcı bir nəzər saldı*; **~ signal** xəbərdarlıq siqnalı/işarəsi; **~ shot** *hərb.* xəbərdarlıq atəşi;

◊ **~ area** *hərb.* uçuş sahəsi/zonası

**warp[1]** [wɔ:p] *n* I **1**. deformasiya, əyilmə, qabarma *(rütubətdən, istidən)*; *The wood has developed a slight warp Taxtada bir balaca deformasiya/əyilmə baş veribdir*; **2**. *məc.* dəyişiklik; təhrif, səhv mühakimə; **a ~ in *smb.*'s character** bir kəsin xasiyyətində dəyişiklik; **3**. suyun gətirdiyi lil; **4**. *k.t.* bala salma *(heyvanlarda)*

**warp** [wɔ:p] *n* II *toxuc.* əriş, çillə

**warp[2]** [wɔ:p] *v* **1**. deformasiya olmaq, əyilmək, qabarmaq; əymək, şəklini dəyişmək; *The hot sun warped the boards İsti günəş taxtaları qabartdı; The wood began to warp Ağac deformasiya olmağa başladı*; **2**. təhrif etmək, pozmaq, korlamaq, dəyişmək *(nöqteyi-nəzəri, fikri və s.)*; **to ~ *one's* whole life** bütün həyatını korlamaq/pozmaq; *His judgement is warped Onun fikri/mühakiməsi təhrif olunub; Her views of men had been warped by several bad experiences Başına gəlmiş bir sıra qəziyyələr nəticəsində onun kişilər haqqında fikri tamamilə dəyişmişdi*; **3**. *k.t.* lillə münbitləşdirmək; **4**. *k.t.* bala atmaq/salmaq *(heyvanlarda)*

**war-paint** [ˈwɔ:peɪnt] *n* **1**. *Şimali Amerika hindularının yürüşə getməzdən əvvəl bədənlərini rəngləmələri*; **2**. *d.d.* parad geyimi/paltarı; **3**. kosmetika *(ənlik, kirşan, pomada)*

**warper** [ˈwɔ:pəʳ] *n toxuc.* **1**. çillə hazırlayan fəhlə; **2**. çillə maşını

**war-plane** [ˈwɔ:pleɪn] *n* hərbi təyyarə, döyüş təyyarəsi

**war-proof** [ˈwɔ:pru:f] *adj* müharibəyə davam gətirməyə qabil

**warrant[1]** [ˈwɔrənt] *n* **1**. order, vəkalət; **to issue a ~ for *smb.*'s arrest** bir kəsin həbsi haqqında order vermək; **a ~ to arrest a suspected criminal** şübhəli canini tutmaq üçün order; **~ of death** ölüm hökmünü icra etmə haqqında vəkalət; **2**. ixtiyar, səlahiyyət; haqq, əsas; *He had no warrant for saying so Onun belə deməyə heç bir ixtiyarı/ səlahiyyəti yox idi; There was no warrant for such behaviour Belə davranışa heç bir əsas yox idi*; **3**. zəmanət, qarantiya; sübut; təsdiq; *His presence here is a warrant of his sincerity Onun burada olmağı onun səmimiliyinin sübutudur/təsdiqidir*; **4**. *iqt.* vəsiqə, şəhadətnamə; kupon *(zayom, aksiya üçün)*; **dividend ~** dividend almaq üçün olan şəhadətnamə/kupon; **share ~** səhm/qiymətli kağız təqdim edən; **5**. *hərb.* yüksək unter-ofiser rütbəsi verilməsi haqqında əmr; **~ officer** unter-ofiser/zabit *(orduda, hərbi dəniz donanmasında)*

**warrant[2]** [ˈwɔrənt] *v* **1**. bəraət vermək, haqq qazandırmaq, haqlı çıxartmaq; *Nothing can warrant such insolence Bu cür abırsızlığa heç nə haqq qazandıra bilməz; Further investigation is clearly warranted Sonrakı tədqiqata/istintaqa aydınca bəraət verilir*; **2**. zəmanət vermək/etmək, zamin olmaq; *I'll warrant him an honest fellow Onun vicdanlı/namuslu adam olmasına mən zəmanət verərəm; He will be back, I warrant you Sizi əmin edirəm ki, o, geri qayıdacaq; The genuineness is warranted by several facts Saflıq bir sıra faktlarla təsdiq olunur*; **3**. *hüq.* hüquq/ixtiyar/səlahiyyət vermək; *The law warrants this procedure Qanun bu cür proseduralara/üsullara yol verir*

**warrantable** [ˈwɔrəntəbl] *adj* **1**. qanuni, yol verilən, mümkün ola bilən; **2**. *arx.* etibarlı, qəbul edilə bilən, müsbət

**warrantee** [ˌwɔrənˈti:] *n hüq.* zəmanət/zaminlik verən adam

**warranter** [ˈwɔrəntəʳ] *n* = **warrantor**

**warrantor** [ˈwɔrəntəʳ] *n* zaminlik/zəmanət verən şəxs

**warranty** [ˈwɔrəntɪ] *n* **1**. əsas, haqq; **sufficient ~ for *smth*.** bir şey üçün kifayət qədər əsas; **2**. icazə; rəsmi sanksiya; **3**. *tic.* zəmanət, zaminlik; *Can you give me a warranty of quality for these goods? Bu malların keyfiyyəti üçün mənə zəmanət verə bilərsənmi?/bilərsinizmi?*; **to buy a car without a ~** qarantiyasız maşın almaq; **4**. *hüq.* qeyd, qeyd-şərt *(müqavilədə, sazişdə)*

**warren** [ˈwɔrɪn] *n* **1**. dovşanların doğub-törədiyi yer/sahə; dovşan qəfəsi; **2**. *arx.* ov etmə qoruğu; **beasts of ~** qoruq heyvanları; **3**. *məc.* tünlük, basabas; qələbəlik, keçilməsi çətin olan dolanbac küçə; **to lose oneself in a ~ of narrow streets** dolanbac dar küçələrdə yolunu itirmək/azmaq;

◊ **packed like/thick as rabbits in a ~** ≅ qarışqa kimi qaynaşan; ağzına qədər doldurulmuş, çox sıx

**warring** [ˈwɔ:rɪŋ] *adj* **1**. vuruşan; müharibə vəziyyətində olan; **~ nation/power** vuruşan dövlət; **2**. barışmaz, zidd, bir-birinə uyuşmayan; **~ passions** barışmaz ehtiraslar; **~ elements** bir-birinə uyuşmayan ünsürlər *(su, atəş, od)*

**warrior** [ˈwɔrɪəʳ] *n şair.* döyüşçü, əsgər; **The Unknown Warrior** Naməlum əsgər

**warship** [ˈwɔ:ʃɪp] *n* hərbi gəmi

**war-struck** [ˈwɔ:strʌk] *adj* müharibə çulğamış *(ölkə haq.)*

**wart** [wɔ:t] *n* **1**. ziyil; **2**. ağac fırı *(ağacın, bitkinin gövdəsində olan şiş)*; **3**. *hərb. dən.* təzəcə vəzifə almış/təyin edilmiş zabit/miçman;

◊ **to paint *smb.* with his ~s** bir kəsi olduğu kimi təsvir etmək; **~s and all** çatışmazlıq, çatışmayan cəhət; qüsur; *You agreed to marry me, warts and all! Bütün qüsurlarıma baxmayaraq, sən/siz mənə ərə gəlməyə razı oldun/oldunuz*

**wartime** [ˈwɔ:taɪm] *n* müharibə zamanı/vaxtı; **in ~** müharibə vaxtında/zamanında; *Special regulations were introduced in wartime Müharibə*

zamanı xüsusi tənzimləyici qaydalar tətbiq edildi; ~ **recollection** müharibə xatirələri

**wartwort** ['wɔ:twɔ:t] *n bot.* südləyən *(bitki)*

**warty** ['wɔ:tı] *adj* ziyilli, ziyillə dolu *(üz və s. haq.)*

**war-whoop** ['wɔ:hu:p] *n* Amerika hindularının hərbi nidası/hayı

**war-worn** ['wɔ:wɔ:n] *adj* **1.** müharibə nəticəsində əldən düşmüş/zəifləmiş/üzülmüş; ~ **visage** döyüşçünün əldən düşmüş/zəifləmiş sifəti/görünüşü; **2.** müharibədə köhnəlmiş/sıradan çıxmış *(texnika və s.)*; ~ **region** müharibə nəticəsində boşalmış/dağılmış/xaraba qalmış rayon

**wary** ['weərı] *adj* **1.** ehtiyatlı, diqqətli, ehtiyatkar, ehtiyatlı olan; **to be ~ of** ***smb./smth.*** bir kəsdən/bir şeydən ehtiyatlanmaq/özünü gözləmək; **to be ~ of giving offence** bir kəsi incitməkdən /bir kəsin xətrinə dəyməkdən qorxmaq; **to be ~ in the choice of words** sözləri seçməkdə ehtiyatlı olmaq; *She is wary of strangers O, yad adamlardan ehtiyatlanır*; **2.** şübhəli; ehtiyatlı; inanılmaz; ~ **look** şübhəli baxış; **to keep a ~ eye on** ***smth.*** bir şeyi ehtiyatla/diqqətlə izləmək

**was** [wɔz] *(tam forma)* [wəz], *(zəif forma)* **"to be"** *felinin təkdə pt forması*

**wash¹** [wɔʃ] *n* **1.** yuma, yuyunma; *Have a wash and brush up Yuyun/Yuyunun və saçlarını/saçlarınızı dara/darayın*; **to give a ~** yumaq, yuyub təmizləmək; *Give the car a good wash Maşını yaxşı-yaxşı yu/yuyun*; **2.** **(the ~) 1)** paltar yuma, yuyulma; **to send clothes to the ~** paltarları yuyulmağa göndərmək; **at the ~** yuyulmaqda olma *(paltar haq.)*; **2)** *d.d.* dəyişək, tuman-köynək, alt paltarları; **to hang out the ~ to dry** qurumaq üçün dəyişəkləri sərmək/asmaq; *The wash goes out on Monday and comes back on Saturday Paltarlar/Camaşır bazar ertəsi yuyulmağa verilir və şənbə günü qaytarılır/gətirilir; Take the wash out of the machine Paltarları maşından çıxart/çıxardın; All my shirts are in the wash Mənim bütün köynəklərim yuyulmağa verilib; When does the wash come back from the laundry? Camaşırxanadan paltarlar nə vaxt gətirilir?; She has a large wash this week Onun bu həftə çoxlu yuyulmalı paltarları var*; **3.** çirkab, çirkab suyu, qab-qacaq suyu, çirkli su; *məc.* qab suyu; *This soup/tea is mere wash Bu, sup/çay deyil, xalis çirkab suyudur*; **4.** *d.d.* cəfəngiyyat, boşboğazlıq, çərənçilik, çərənçilik etmə, boş-boş danışma; **5.** ləpədöyənin səsi; **the ~ of the waves** sahilə çırpılan dalğaların/ləpədöyənin səsi; **6.** qarqara, yaxalama; islatma dərmanı; **mouth ~** ağzını yaxalama; **~ for the eyes** gözləri yuma/ islatma vasitəsi; **hair ~** saçları bərkitmə vasitəsi; **7.** nazik təbəqə, nazik qat *(metal, duru rəng və s.)*; **8.** qum, çınqıl, su ilə və ya küləklə gətirilən torpaq yığını, çöküntülər; **9.** *arx.* çay yatağı; **10.** qızıllı qum, tərkibində qızıl olan qum; **11.** bataqlıq, gölməçə; **12.** dərə, yarğan, qobu;

◊ **to come out in the ~** açılmaq; aydınlaşmaq; düzəlmək; *It'll all come out in the wash Hər şey düzələcək, Hər şey açılacaq; Don't worry, I'm sure it'll come out in the wash Təlaş keçirmə! Mən əminəm ki, hər şey düzələcək/aydınlaşacaq*

**wash²** [wɔʃ] *v* **1.** yumaq; yuyunmaq; yuyub təmizləmək; *She washed her hands in hot water O, əllərini isti suda yudu; I must wash before dinner Mən nahardan əvvəl yuyunmalıyam; Have these glasses been washed? Bu stəkanlar yuyulubmu?; I had to wash and dress in a hurry Mən tələsik yuyunmalı və geyinməli idim*; **2.** sürtülmək *(parça haq.)*; solmamaq *(yuyanda)*; *Does this material wash? Bu parça yuyulanda solurmu?, Bu parçanı yumaq olarmı?*; **3.** *məc.* qəbul edilməmək; yaramamaq; tənqid etməyinə dəyməmək; *That theory won't wash O nəzəriyyəni tənqid etməyinə dəyməz; The excuse won't wash Bu üzrxahlıq yaramaz/qəbul edilə bilməz*; **4.** çarpmaq, şappıltı ilə dəymək *(dalğa)*; **5.** yumaq; yuyub aparmaq *(sahili; həm də* **to ~ upon**); *The sea washes the base of the cliffs Dəniz qayaların dibini yuyur/yuyub aparır; The waves wash the shore Dalğalar dənizin sahilini yuyur*; **6.** dağıtmaq, uçurmaq; yıxmaq; yuyub aparmaq *(su)*; *Water had washed a channel Su kanalı dağıtdı/yuyub apardı; He was washed overboard by a huge wave Böyük bir dalğa onu göyərtədən vurub apardı; The flood washed out the road Sel yolu dağıtdı/yuyub apardı*; **7.** tökülmək, daşıb tökülmək, daşmaq; **8.** islatmaq, yuyub təmizləmək; *The dew washes flowers Şeh çiçəkləri yuyur*; **9.** nazik təbəqə ilə/qatla örtmək; **to ~ with varnish** lakla örtmək; **10.** ağartmaq, ağ rəng/boya çəkmək *(tavan, divar və s.)*; **11.** qızıllı qumu yumaq; **to ~ gravel for gold** qızıllı qumu yumaq; **to ~ away/off 1)** yumaq, yuyub aparmaq; **to ~ away a car** maşını yuyub təmizləmək; **to ~ dirty marks off a wall** divardan çirkli ləkələri yumaq; **2)** *məc.* yumaq *(mənəvi cəhətdən)*; **to ~ away** ***one's*** **sin** günahını yumaq; **to ~** ***smth.*** **down (with** ***smth.*****) 1)** bir şeylə yuyub təmizləmək, yumaq *(şlanqla)*; **to ~ down the deck of a ship** gəminin göyərtəsini şlanqla yumaq; *Wash down a car with a hose Maşını şlanqla yu/yuyun*; **2)** üstünə su əndərmək; **3)** bir şeyin üstündən içmək; *My lunch was bread and cheese washed down with beer Mənim günorta yeməyim çörək, pendir və üstündən içdiyim pivədən ibarət idi*; **to ~ off** yumaq, yuyub təmizləmək/aparmaq; **to ~ off a spot** ləkəni yuyub aparmaq; **to ~ out 1)** yumaq, yuyub təmizləmək; yuyunmaq *(həm də məc.)*; **to ~ out a cup/a vase 1)** fincanı/vazanı yuyub təmizləmək; **2)** *məc.* yumaq; **to ~ out an insult in blood** təhqiri qanla yumaq; **3)** başlı-başına buraxmaq, fikir verməmək, baş qoşmamaq *(bir şeyə)*; **4)** gücdən /əldən salmaq; **to be ~ed out, to look ~ed out after illness** xəstəlikdən sonra əldən düşmək/üzülmək; **5)** yuyulub təmizlənmək; *The*



*stain washed out Ləkə yuyulub təmizləndi*; **6)** *d.d.* kəsmək; kəsilmək, müvəffəqiyyətsizliyə uğramaq *(imtahanda, sınaqda)*; **7)** yararsız hesab etmək *(hərbi qulluğa)*; **to ~ out an officer** *amer. hərb.* zabitin rütbəsini alçaltmaq/zabiti yararsız hesab etmək; **8)** solmaq, bozarmaq, getmək *(rəng haq.)*; **to ~ over 1)** daşmaq, qıraqlarından tökülmək; **2)** yağdırmaq, üstünə yönəltmək; *All the criticism she's had seems to have washed right over her Bütün tənqidlər, görsəndiyi kimi, düz ona yönəldilmişdi*; **to ~ up 1)** yumaq *(qab-qacağı)*; *She washed up dishes, glasses, knives, forks after meal Yeməkdən sonra o, nimçələri, stəkanları, bıçaqları, çəngəlləri yudu*; **2)** yuyunmaq; **3)** sahilə atmaq *(bir şeyi)*; *Cargo from the wrecked ship was washed up on the shore Qəzaya uğramış gəmidən yük sahilə atılmışdı*;

◊ **to ~** ***one's*** **dirty linen in public** ≅ evin sirrini bayıra çıxarmaq; **to ~ an ass's head/ears** mənasız işlə məşğul olmaq; nahaq yerə çalışmaq; **to ~** ***one's*** **hands** yaxasını kənara çəkmək

**washable** ['wɔʃəbl] *adj* yuyulan, yuyulmağa davamlı, yuyula bilən, solmayan; ~ **toys** yuyulan oyuncaqlar; ~ **clothes** yuyula bilən paltarlar

**wash-and-wear** ['wɔʃən'weə'] *n* yuyulub geyilən paltar, yuyulandan sonra ütü tələb etməyən parçadan olan paltar

**wash-basin** ['wɔʃ.beısn] *n* əl-üz yuyulan ləyən / tas / çanaq, əlüzyuyan

**wash-boiler** ['wɔʃ.bɔılə'] *n* paltar qaynatmaq üçün bak

**wash-bowl** ['wɔʃboul] *n* = **wash-basin**

**washcloth** ['wɔʃklɔθ] *n* **1.** *amer.* saçaqlı hamam lifi; **2.** qab yumaq üçün əsgi

**wash-day** ['wɔʃdeı] *n* paltar yuma günü; *Monday is wash-day in our house Bazar ertəsi bizim evdə paltar yuma günüdür*

**wash-drawing** ['wɔʃ.drɔ:ıŋ] *n* **1.** *rəs.* akvarel; sulu boya; **2.** üzərinə tuş dağılmış şəkil

**washed** [wɔʃt] *adj* yuyulmuş, təmizlənmiş; ~ **clothes** yuyulmuş paltar

**washer** ['wɔʃə'] *n* **1.** paltaryuyan, yuyucu *(fəhlə)*; **2.** paltaryuyan maşın; **3.** *tex.* şayba *(vint və ya qaykanın altına qoyulan halqa, metal lövhəcik)*

**washerman** ['wɔʃəmən] *n* *(pl* **-men** [-mən]) **1.** paltaryuyan *(kişi)*; **2.** yuyucu, yuyan *(fəhlə)*

**washerwoman** ['wɔʃə.wumən] *n* *(pl* **-women** [-.wımın]) paltar yuyan *(qadın)*

**wash-hand-basin** ['wɔʃhænd.beısn] *n* = **wash-basin**

**wash-house** ['wɔʃhaus] *n* **1.** camaşırxana, paltar yuyulan yer; **2.** hamam; duşxana; **3.** *tex.* kömür yuyulan yer

**washiness** ['wɔʃınıs] *n* **1.** duruluq, duru/sulu olma *(sup və s.)*; **2.** solğunluq, rəngi qaçmış olma; **3.** ağırlıq *(heca haq.)*; **4.** zəiflik, süstlük, keylik, ölüvaylıq *(adam haq.)*

**washing¹** ['wɔʃıŋ] *n* **1.** yuma; paltar yuma; *The sweater had shrunk after repeated washing(s) Dəfələrlə yuyulmaqdan sviter gödəlib/kiçilib/girib; Washing is a chore Paltar yumaq yorucu işdir*; **2.** dəyişək, paltar, ağ, tuman-köynək *(yumaq üçün)*; *Put a load of washing in the machine Bir yığın/ qalaq dəyişəkləri/ağları paltaryuyan maşına sal/ salın; Hang the washing on the line to dry Yuyulan paltarları qurumaq üçün ipə sər/sərin*; **3.** nazik təbəqə *(metal, rəng və s.)*

**washing²** ['wɔʃıŋ] *adj* **1.** yuyucu, yuyulan, yuyularkən solmayan/girməyən; **2.** yuyan, yumaq üçün işlədilən; ~ **powder** yuyucu toz; **3.** *d.d.* yumaq üçün olan; ~ **things** sabun, diş şotkası və s.

**washing-day** ['wɔʃıŋdeı] *n* = **wash-day**

**washing-house** ['wɔʃıŋhaus] *n* = **wash-house**

**washing-machine** ['wɔʃıŋmə.ʃi:n] *n* paltaryuyan maşın

**washing-soda** ['wɔʃıŋ.soudə] *n* paltar sodası

**washing-stand** ['wɔʃıŋstænd] *n* = **wash-stand**

**washing-up** ['wɔʃıŋʌp] *n* **1.** qab-qacağın yuyulması; *Do the washing-up! Qağ-qacağı yu/yuyun!*; **2.** yumaq üçün toplanmış çirkli qab-qacaq; *The washing-up had been left in the sink Çirkli qab-qacaq tasda qalmışdı/yuyulmamışdı*

**wash-kitchen** ['wɔʃ.kıtʃın] *n* camaşırxana *(evdə)*

**wash-leather** ['wɔʃ.leðə'] *n* zamşa *(yumşaq maral dərisi)*

**wash-linen** ['wɔʃ.lının] *n* yuyulmalı olan ağ, çirkli alt paltarı

**wash-out** ['wɔʃaut] *n* **1.** yuma; yaxalama; **2.** *d.d.* kəsilmə *(imtahanda və s.)*; uğursuzluq; *The attempt was a complete wash-out Təşəbbüs tam uğursuzluğa düçar oldu*; **3.** *d.d.* uğursuz/bəxtsiz/işi düz gətirməyən adam; *He was a wash-out as a lecturer O, mühazirəni çox pis oxuyurdu*; **4.** *av. d.d.* təyyarə qəzası; **5.** *geol.* eroziya, torpaq aşınması

**wash-stand** ['wɔʃstænd] *n* əlüzyuyan

**wash-room** ['wɔʃrum] *n* **1.** yuyunma otağı, duşxana; **2.** *amer.* ayaqyolu, tualet *(xüs. ictimai yerlərdə)*

**wash-tub** ['wɔʃtʌb] *n* paltar ləyəni

**wash-up** ['wɔʃ'ʌp] *n* **1.** = **washing-up**; **2.** sahilə atılmış/çırpılmış şey *(dalğa və s. vasitəsilə)*

**wash-water** ['wɔʃ.wɔtə'] *n* sabunlu/sodalı su *(paltar yumaq üçün)*

**washwoman** ['wɔʃ.wumən] *n* = **washerwoman**

**washy** ['wɔʃı] *adj* **1.** sulu, duru; su qatılmış; **2.** solğun, rəngi qaçmış/ağarmış, saralmış *(rəng haq.)*; **3.** zəif *(əsərin dili haq.)*; **4.** zəif, süst, ölüvay, əzgin *(adam haq.)*

**wasp¹** [wɔsp] *n zool.* eşşəkarısı

**wasp²** [wɔsp] *adj* eşşəkarısı; **a ~ sting** eşşəkarısının sancması/dişləməsi

**waspish** ['wɔspıʃ] *adj* zəhərli, acı; hirsli, kinli, acıqlı, kəskin; ~ **temper** kinli/acıqlı xasiyyət; ~ **comment** zəhərli/acı/kəskin rəy

**wassail** ['wɔseıl] *v* **1.** kef/əyyaşlıq/sərxoşluq et-

mək, vaxtını kef məclislərində keçirmək; 2. bir kəsin sağlığına tost demək

**wassailing** ['wɔsəlɪŋ] *n arx.* 1. sərxoşluq, sərxoşluq etmə; 2. *Milad bayramı himnlərini oxuya-oxuya müqəddəs məqsədlə evləri bir-bir gəzmə*

**wast** [wɔst] *(tam forma);* [wəst] *(zəif forma) arx.* **to be** *felinin pt forması*

**wastage** ['weɪstɪdʒ] *n* 1. köhnəlmə, yeyilmə, yırtılma *(işlənməkdən)*; itki; əskilmə *(axma və s. nəticəsində)*; **food** ~ ərzaq itkisi; **a ~ of natural resources** təbii sərvətlərin azalması/əskilməsi/itkisi; **normal** ~ təbii itki/əskilmə; 2. israfçılıq, bədxərclik

**waste¹** [weɪst] *n* 1. səhra, biyaban, çöl-biyaban, düzənlik; *The stolen car was found on a piece of waste ground Oğurlanmış maşın bir çöl-biyabanda tapıldı;* 2. 1) itki, ziyan, zərər; korlanma, korlama, xarab etmə; 2) *hüq.* iflas, korlanma, korlama, laqeyd münasibət *(xüs. icarədarın başqasının malına)*; 3. israfçılıq, bədxərclik; nahaq yerə sərf etmə; *It is a waste of time/money/energy Bu, vaxtın/pulun/enerjinin əbəs yerə sərf edilməsidir;* **oil** ~ yağ israfı; ~ **of time** vaxt israfı, nahaq yerə vaxt sərf etmə/itirmə; **to run/to go to** ~ 1) korlamaq; hədər yerə sərf etmək; 2) istifadəsiz/sərf edilməmiş qalmaq; **to cut to** ~ parçanı kəsib korlamaq; parçanı gen-boluna/qənaətsiz kəsmək; **cotton** ~ pambıq tullantılar *(kəpitkə, lif, kilkə)*; 4. *geol.* baş süxur

**waste²** [weɪst] *adj* 1. boş, heç kim yaşamayan, çöl-biyaban; becərilməmiş, xam; qeyri-məhsuldar; **to lie** ~ becərilməmiş/xam qalmaq *(torpaq haq.)*; ~ **lands** xam torpaqlar; 2. viran edilmiş, xaraba qoyulmuş, dağıdılmış; **to lay** ~ xaraba qoymaq, viran etmək, dağıtmaq; **land laid ~ by war** müharibə nəticəsində xaraba qalmış/dağıdılmış ölkə; 3. mənasız, gərəksiz, yararsız, artıq; nahaq; ~ **effort** mənasız/nahaq səy; ~ **paper** makulatura *(gərəksiz/yararsız kağızlar)*; ~ **pipes** gərəksiz/lazımsız borular; ~ **life** mənasız (keçirilmiş) həyat; 4. *tex.* işlənmiş, istifadə edilmiş; ~ **steam** işlənmiş buxar; ~ **heat** işlənmiş /istifadə olunmuş istilik; 5. brak edilmiş, zay, yararsız; ~ **products** yararsız məhsullar

**waste³** [weɪst] *v* 1. boş yerə sərf etmək, səmərəsiz sərf etmək; bədxərclik etmək *(pulu, gücü və s.)*; **to ~ money** pulu səmərəsiz xərcləmək, pulu göyə sovurmaq; **to ~ words** havayı/boş-boş danışmaq; *My joke was wasted upon him O mənim zarafatımı anlamadı/başa düşmədi; His efforts were wasted Onun səyləri boşa çıxdı/havayı getdi;* 2. boş yerə/havayı itmək; *Turn the water off: don't let it waste Kranı bağla/bağlayın, su havayı yerə axmasın;* 3. xaraba qoymaq, viran etmək, dağıtmaq; *Roman troops wasted Celtic lands Roma qoşunları Kelt torpaqlarını viran etdilər/xaraba qoydular; Armenian bandits wasted Garabagh Ermənі quldurları Qarabağı viran etdilər;* 4. korlamaq; **to be entirely ~d** tamamilə korlanmaq; 5. yormaq, əldən/taqətdən /haldan salmaq, üzmək; *He was wasted by disease Xəstəlik onu üzdü/taqətdən saldı;* 6. qurumaq, ərimək, zəifləmək, arıqlamaq *(həm də* **to ~ away**); **to ~ away for lack of food** qidasızlıqdan zəifləmək/çöpə dönmək/arıqlamaq/ ərimək; 7. sona çatmaqda olmaq, qurtarmaq üzrə olmaq *(vaxt haq.); The day wastes Gün qurtarır, Gün qurtarmaq üzrədir;* 8. çəkidə itirmək *(məşqdə)*;

◊ *Waste not, want not at. söz.* ≅ *Qəpiyi güdməyən, manata möhtac olar/qalar*

**waste-basket** ['weɪst.ba:skɪt] *n amer.* = **waste-paper-basket**

**wasteful** ['weɪstful] *adj* bədxərc, israfçı; **a ~ use of energy/natural resources** enerjidən/təbii ehtiyatlardan israfçılıqla istifadə etmə

**waste-paper-basket** [.weɪst'peɪpə.ba:skɪt] *n* yararsız kağızlar üçün zənbil; zibilqabı; **fit for the** ~ heç bir şeyə yaramayan, gərəksiz, tullantı

**waste-pipe** ['weɪst.paɪp] *n* navalça

**waster** ['weɪstə'] *n* 1. israfçı, bədxərc *(adam)*; 2. brak, çıxdaş *(keyfiyyətsiz mal)*; 3. *d.d.* avara/ yararsız adam

**wastewater** ['weɪst.wɔ:tə'] *n* 1. çirkab; 2. yağış suyu

**waste-way** ['weɪstweɪ] *n amer.* suaşıran kanal/dəlik

**wasting¹** ['weɪstɪŋ] *n* 1. zəiflik, taqətdən/gücdən düşmə; 2. *mæc.* tənəzzül, geri getmə; 3. *tib.* atrofiya *(fəaliyyətdən qalma, həyat qabiliyyətini itirmə)*

**wasting²** ['weɪstɪŋ] *adj* 1. viranedici, viran/xaraba qoyan, dağıdıcı, məhv edən; ~ **wars** viranedici/ dağıdıcı/xaraba qoyan müharibələr; 2. üzücü, taqətdən salan *(xəstəlik haq. və s.)*

**wastrel¹** ['weɪstrəl] *n* 1. bədxərc, israfçı, pul korlayan; *He is a wastrel O, bədxərc adamdır;* 2. yararsız/vecsiz adam, heç bir şeyə yaramayan adam; 3. küçə uşağı *(oğlan haq.)*

**wastrel²** ['weɪstrəl] *adj* 1. brak edilmiş, çıxdaş; 2. bədxərc, israfçı

**wasty** ['weɪstɪ] *adj* 1. davamsız, tezsınan; səbatsız, dayanaqsız; tez xarab olan; 2. çirkli, aşqarlı; ~ **wool** çirkli yun

**watch¹** [wɔtʃ] *n* I saat *(cib, qol)*; **to wind/to set a** ~ saatı qurmaq; *My watch is fast/slow Mənim saatım qabağadır/geri qalır;* **by/on my** ~ mənim saatımda; *He set his watch by mine O, saatını mənimki ilə qurdu/düzəltdi; My watch has run down Mənim saatım dayanıb*

**watch** [wɔtʃ] *n* II 1. (over) diqqət, göz olma; müşahidə etmə; **to keep a ~ over** ***smb./smth.*** 1) bir kəsə/bir şeyə göz qoymaq; *The police are keeping a close/careful watch on the activities of those men Polis o kişilərin fəaliyyətlərinə/hərəkətlərinə çox diqqətlə/ciddi nəzarət edir; The sentry was keeping watch Gözətçi diqqətlə nəzarət edirdi/göz qoyurdu;* 2) bir kəsi/bir şeyi güdmək/gözətləmək; 2. *dən.* növbə *(gəmidə: 2*



*yaxud 4 saatlıq)*; **the starboard and port ~** birinci/ikinci növbə; 3. *tar.* qarovul, gözətçi *(gecə vaxtı)*; **the town ~** şəhər gözətçisi/ keşikçisi; **the night ~** gecə gözətçisi; *The police put a watch on the suspect's house Polis şübhələndiyi evə gözətçi/keşikçi qoydu;* 4. *məc.* ayıq qalma, yatmama; oyaqlıq;

◊ **to pass as a ~ in the night** iz qoymadan keçib getmək; ~ **and ward** 1) ciddi/möhkəm güdmə; 2) gecə-gündüz güdmə/göz qoyma

**watch²** [wɔtʃ] *v* 1. göz qoymaq, izləmək, müşahidə etmək; **to ~ the development of affairs** hadisələrin inkişafını izləmək; *Watch that he doesn't fall Gözlə ki, o yıxılmasın;* 2. baxmaq; **to ~ TV** televizora baxmaq; *Watch me, mother! Ana, mənə bax! (bax ki, mən velosipeddə və s. necə gedirəm); Are you going to play or only watch? Sən/Siz oynayacaqsan /oynayacaqsınız, yoxsa təkcə baxacaqsan/ baxacaqsınız?;* 3. keşik/qarovul çəkmək, mühafizə etmək *(həm də* **to ~ over**); *Could you watch my clothes while I have a swim Mən çimən-də (mənim) paltarıma baxa bilərdinmi/bilərdinizmi?;* 4. otarmaq; *The shepherd was watching his sheep Çoban qoyunlarını otarırdı;* 5. (for) gözləmək; **to ~ for a favourable chance/opportunity** əlverişli fürsət/imkan gözləmək; **to ~ for a signal** bir siqnal gözləmək; *Watch yourself! Özünü/Özünüzü gözlə/ gözləyin!;* 6. ayıq-sayıq olmaq, özünü gözləmək; ehtiyatlı olmaq; fikir vermək *(özünə); Watch what you say! Nə dediyinə fikir ver!; You had better watch your language Yaxşı olardı ki, danışığına /danışığınıza fikir verəydin/verəydiniz;* 7. növbətçilik etmək *(xüs. gecə)*; **to ~ with a sick person, to ~ at** ***smb.'s*** **(bed) side** xəstənin yanında /xəstənin çarpayısı yanında növbətçilik çəkmək; 8. yatmamaq, oyaq qalmaq; *Watch and pray! Yatmayın və dua edin!;* **to ~ in** təzə ili qarşılamaq; **to ~ for** gözləmək; *She watched for her chance to speak O danışmaq üçün fürsət gözlədi;* **to ~ out** *amer.* özünü gözləmək, ayıq-sayıq olmaq; *Watch out! There is a car coming Özünü/Özünüzü gözlə/ gözləyin, maşın gəlir; Watch out for a tall man in a black hat Qara şlyapalı hündür boylu kişidən özünü qoru/gözlə/ehtiyatlı ol; Watch out for the dog! İtdən özünü gözlə!;* **to ~ over** mühafizə etmək, keşik çəkmək, baxmaq; *Watch over my clothes, please! Zəhmət olmasa, paltarlarımda göz ol/olun!;*

◊ *A watched pot never boils* ≅ *Gözləyəndə vaxt uzanır;* **to ~ one's step** 1) ehmal yerimək; 2) ehtiyatla hərəkət etmək; **to ~ the clock** *jarq.* işə barmaqarası yanaşmaq, bir təhər vaxtı başa vurmaq *(işdə)*

**watch-boat** ['wɔtʃbout] *n dən.* gözətçi qayıq

**watch-box** ['wɔtʃbɔks] *n* gözətçi budkası

**watch-case** ['wɔtʃkeɪs] *n* saat korpusu

**watch-chain** ['wɔtʃtʃeɪn] *n* saat zənciri

**watch-crystal** ['wɔtʃ.krɪstəl] *n* = **watch-glass**

**watch-compass** ['wɔtʃ'kʌmpəs] *n* cib kompası *(dəyirmi)*

**watchdog** ['wɔtʃdɔg] *n* 1. çoban iti, keşik çəkən köpək/it; 2. *amer.* nəzarətçi, keşikçi; dövlət vəsaitinə nəzarət edən adam

**watcher** ['wɔtʃə'] *n* 1. keşikçi, gözətçi; 2. müşahidəçi, nəzarətçi; 3. *amer.* seçkilərə nəzarət edən müşahidəçi; 4. *hərb.* növbətçi teleqrafist/radist

**watch-fire** ['wɔtʃ.faɪə'] *n* 1. tonqal siqnalı; 2. qoşun düşərgəsi tonqalı

**watchful** ['wɔtʃful] *adj* 1. ayıq, ayıq-sayıq; diqqətli, ehtiyatlı; *She kept a watchful eye on the children O, uşaqlara diqqətlə nəzarət etdi/göz qoydu;* **to be ~ of the symptoms** simptomları/əlamətləri diqqətlə izləmək; 2. ehtiyatlı, sayıq; **to keep ~ guard** ehtiyatla mühafizə etmək; 3. (of) heç kəsə inanmayan, hər şeydən şübhələnən; **to be ~ of** ***smb./smth.*** bir kəsə/bir şeyə şübhə ilə yanaşmaq

**watch-glass** ['wɔtʃgla:s] *n* saat şüşəsi

**watch-guard** ['wɔtʃga:d] *n* saat zənciri/qayışı

**watch-house** ['wɔtʃhaus] *n hərb.* keşikçi/qarovulçu budkası

**watch-key** ['wɔtʃki:] *n* saat açarı, saat qurmaq üçün açar

**watch-maker** ['wɔtʃ.meɪkə'] *n* saatsaz; **~'s** saatsaz emalatxanası

**watchman** ['wɔtʃmən] *n (pl* **-men** [-mən]) gözətçi; qarovulçu, keşikçi; **a night ~** gecə gözətçisi/ keşikçisi

**watch-night** ['wɔtʃnaɪt] *n din.* yeni il gecəsində edilən dua/ ibadət, axşam duası *(xristianlarda)*

**watch-pocket** ['wɔtʃ.pɔkɪt] *n* saat cibi

**watch-spring** ['wɔtʃ.sprɪŋ] *n* saat yayı

**watch-tower** ['wɔtʃ.tauə'] *n* gözətçi qülləsi

**watch-word** ['wɔtʃwə:d] *n* parol *(məxfi söz)*; *"Safety" is our watchword "Təhlükəsizlik" bizim parolumuzdur*

**water¹** ['wɔtə'] *n* 1. su; **cold/hot/salt/boiled ~** soyuq /isti/duzlu/qaynadılmış su; *Water is changed into steam by heat and into ice by cold Su istidən buxara, soyuqdan buza çevrilir;* **fresh/sweet/ drinking ~** təzə/şirin/içməli su; **a glass of ~** bir stəkan su; *Fish live in (the) water Balıq suda yaşayır; The road is under water after the heavy rain Güclü yağışdan sonra yolu su basmışdır;* **a sheet of ~** su səthi; **a piece of ~** nohur, hovuz, göl; **head of ~** su təzyiqi; **to cut off the ~** suyu bağlamaq/kəsmək; **to turn on the ~** suyu açmaq/ buraxmaq *(vannaya və s.)*; **to rinse in the ~** suda yaxalamaq, suya çəkmək *(paltarı və s.)*; 2. *pl* sular; dəniz; dalğalar; okean; **territorial ~s** ərazi suları; **on/upon the ~** dənizdə, donanmada, dəniz xidmətində; **across/over the ~** 1) dənizin okeanın o tərəfində; 2) Temza çayının o sahilində/ o tərəfində; **to cross the ~** okeanı/dənizi/çayı keçib getmək; 3. *(adət. pl)* mineral sular, müalicə sular; **to drink the ~s** müalicədə olmaq, mineral

sular içmək; **4**. çəkilmə, qabarma; *The boat left at high/low water Gəmi qabarma/çəkilmə zamanı yola düşdü*; **5**. *(pl)* sel, daşqın, güclü sel; *The waters are out Çay daşıb, Su sahildən kənara çıxıb; The waters have fallen Daşqın azalıb, Sel yatıb*; **6**. *fiziol*. ifrazat *(bədənin müəyyən üzvlərindən çıxan maddələr: tər, sidik, göz yaşı, selik və s.)*; **to make/to pass** ~ işəmək, siymək; **red** ~ qanlı sidik; ~ **on the brain** *tib*. beyində hidrops/vadyanka/su yığılması; *It brings the water to one's mouth Adamın ağzı sulanır/ağzının suyu axır; It brought the water into his eyes Onun gözləri yaşardı*; **7**. təmizlik, şəffaflıq, parlaqlıq; əsl, xalis *(qiymətli daşın keyfiyyəti)*; **of the first** ~ **1)** xalis/qiymətli daş *(xüs. brilyant haq.)*; **a diamond of the first** ~ təmiz/xalis/əsl brilyant; **2)** *məc*. nadir, xüsusi, əla; görkəmli; **genius of the first** ~ nadir istedad, görkəmli dahi; **an artist of the first** ~ görkəmli rəssam; **scoundrel of the first** ~ əsl/qatı əclaf; **to hold** ~ **1)** suyu buraxmamaq; **2)** *məc*. tənqidəlayiq olmaq *(nəzəriyyə və s.)*; **table/mineral** ~ mineral su *(şüşədə)*; **home** ~**s** daxili sular;

◊ **under** ~ ümidləri puç olan, uğursuz, bəxtsiz, nəhs; **in deep** ~**(s)** bəlada, fəlakətdə, çətin/təhlükəli vəziyyətdə; **to get into/to be in hot** ~ bəlaya düşmək *(öz təqsiri ucbatından)*; **in low** ~ pul qıtlığı, iflasa uğrama; **like a fish out of** ~ sudan çıxan balıq kimi; **to draw** ~ **in a sieve** xəlbirlə su daşımaq, səmərəsiz işlə məşğul olmaq; **in smooth** ~ müvəffəq olma, uğur qazanma; **to spend money like** ~ pulu göyə sovurmaq, pulu zibil kimi xərcləmək; **to shed blood like** ~ qanı su kimi axmaq, bir aləm qan itirmək; *Still waters run deep at. söz. Sakit sular lal axar;* ≅ *Suyun lal axanı, adamın yerə baxanı*; **written in/on** ~ qısaömürlü, azömürlü *(şöhrət və s. haq.)*

**water[2]** [ˈwɔtər] *adj* su; dəniz, çay; ~ **sports** su idmanları; ~ **pail/cask** su vedrəsi/çəlləyi; ~ **box** su bakı; ~ **plants** su bitkiləri; ~ **reed** su qamışı; ~ **gods** su allahları

**water[3]** [ˈwɔtər] *v* **1**. islatmaq, yaş etmək; **to** ~ ***one's* pillow with tears** balışı/yastığını göz yaşları ilə islatmaq; **2**. sulamaq, su vermək; **to** ~ **the garden/ plants/streets** bağı/bitkiləri/küçələri sulamaq; **to** ~ **flowerbeds** gül ləklərini sulamaq; **to** ~ **horses** atları sulamaq; **to** ~ **cattle** naxırı sulamaq; **3**. sulanmaq *(ağız)*, yaşarmaq *(göz); It made his mouth water Bu onun ağzını sulandırdı; The smoke made my eyes water Tüstü gözlərimi yaşartdı*; **4**. su qatmaq *(həm də* **to** ~ **down**); *This milk has been watered (down) Bu südə su qatılıb*; **5**. su götürmək *(gəmi və s. haq.)*; **6**. *məc*. yumşaltmaq, malalamaq; **to** ~ **down the conflicts** ixtilafları yumşaltmaq/ malalamaq; *This is a watered down version of the original proposal Bu, həqiqi təklifin yumşaldılmış variantıdır*; **7**. *toxuc*. dalğavarı rəngləmək;

◊ **to** ~ ***one's* clay** boğazını islatmaq/yaşlamaq *(bir az içmək)*

**waterage** [ˈwɔ:tərɪdʒ] *n* **1**. su yolu ilə yük daşıma; **2**. su yolu ilə yük daşıma üçün verilən haqq/muzd

**water-anchor** [ˈwɔ:tə,æŋkər] *n dən*. üzən lövbər

**water-bag** [ˈwɔ:təbæg] *n* tuluq; su kisəsi

**water-bailiff** [ˈwɔ:təˈbeɪlɪf] *n* **1**. balıq nəzarətçisi; **2**. *arx*. port gömrükxana məmuru; **3**. çay polisi əməkdaşı

**Water Bearer** [ˈwɔ:tə,beərər] *n astr*. Dolça bürcü

**water-bearer** [ˈwɔ:tə,beərər] *n* su daşıyan, suçu

**water-bearing** [ˈwɔ:tə,beərɪŋ] *adj* rütubətli, su saxlayan, sulu

**water-bed** [ˈwɔ:təbed] *n* su ilə doldurulmuş rezin döşək *(xəstələr üçün)*

**water-bird** [ˈwɔ:təbə:d] *n* su quşu

**water-blister** [ˈwɔ:tə,blɪstər] *n* suluq, qabarcıq

**water-boots** [ˈwɔ:tə,bu:ts] *n pl* rezin çəkmə, uzunboğaz bataqlıq çəkməsi

**water-bottle** [ˈwɔ:tə,bɔtl] *n* **1**. su qrafini; **2**. mehtərə *(çiyindən asılan su qabı)*; **3**. tuluq *(su üçün)*; **4**. *tib*. qrelka, rezin qovuq

**water-bucket** [ˈwɔ:tə,bʌkɪt] *n* su vedrəsi

**water-buffalo** [ˈwɔ:tə,bʌfəlou] *n zool*. kəl

**water-bus** [ˈwɔ:tə,bʌs] *n* çay tramvayı

**water-butt** [ˈwɔ:təbʌt] *n* çəllək *(yağış suyu üçün)*

**water-can** [ˈwɔ:təkæn] *n* **1**. bidon *(mayelər üçün dəmir qab)*; **2**. mehtərə *(çiyindən asılan su qabı)*; **3**. *bot*. ağ suzanbağı

**water-carriage** [ˈwɔ:tə,kærɪdʒ] *n* **1**. su nəqliyyatı; **2**. kanalizasiya

**water-carrier** [ˈwɔ:tə,kærɪər] *n* **1**. suçu, su daşıyan; **2**. su çəlləyi; **3**. *dən*. sutökən gəmi

**water-cart** [ˈwɔ:təka:t] *n* **1**. küçələri sulamaq üçün sistern *(böyük çən)*; **2**. sudaşıyan araba

**water-closet** [ˈwɔ:tə,klɔzɪt] *n* ayaqyolu

**water-colour** [ˈwɔ:tə,kʌlər] *n* **1**. *(adət. pl)* akvarel, sulu boyalar; **2**. akvarellə /sulu boya ilə çəkilmiş şəkil *(həm də* ~ **drawing;** ~ **painting)**

**watercourse** [ˈwɔ:təkɔ:s] *n* **1**. axın, sel; çay; çayın qolu; kanal; **2**. məcra, çay yatağı

**water-cracker** [ˈwɔ:tə,krækər] *n* quru peçenye *(yağsız)*; qalet *(peçenye növü)*

**water-craft** [ˈwɔ:təkra:ft] *n dən*. gəmi; gəmilər

**watercress** [ˈwɔ:təkres] *n bot*. su tərəsi *(çoxillik ot bitkisi)*

**water-cure** [ˈwɔ:tə,kjuər] *n tib*. su müalicəsi, su ilə müalicə

**water-dog** [ˈwɔ:tədɔg] *n* **1**. təcrübəli dənizçi, oddan-alovdan keçmiş dənizçi; yaxşı üzgüçü; **2**. vodolaz *(it cinsi)*

**water-drinker** [ˈwɔ:tə,drɪŋkər] *n* **1**. içki içməyən /dilinə içki vurmayan adam; **2**. mineral sularla müalicə alan kurortçu

**water-drop** [ˈwɔ:tədrɔp] *n* **1**. su damcısı; **2**. göz yaşı

**watered** [ˈwɔ:təd] *adj* **1**. su qatılmış; ~ **wine** su qatılmış şərab/çaxır; ~ **milk** su qatılmış süd; **2**.



su çilənmiş; sulanmış; nəm; **3**. *toxuc*. dalğavarı rənglənmiş; ~ **silk** dalğavarı rənglənmiş ipək; **4**. *mal*. ayrılmış; ~ **stock** ayrılmış səhmdar/aksioner kapitalı

**water-engine** [ˈwɔ:tə,endʒɪn] *n* **1**. suqaldırıcı maşın; **2**. *arx*. yanğınsöndürən maşın

**waterfall** [ˈwɔ:təfɔ:l] *n* **1**. şəlalə; **2**. gözəl/gur şinyon, qadın pariki

**water-flood** [ˈwɔ:təflʌd] *n* **1**. daşqın; su/sel basma; **2**. coşğun dəniz

**waterfowl** [ˈwɔ:təfaul] *n top.i* su quşları

**water-front** [ˈwɔ:təfrʌnt] *n* **1**. port, port/liman rayonu; şəhər rayonu *(çay, dəniz və s. qırağında yerləşən)*; **2**. sahil

**water gang** [ˈwɔ:təgæŋ] *n* qanov, ensiz arx; xəndək, çuxur

**water gap** [ˈwɔ:təˈgæp] *n amer*. dərə, dağ dərəsi; sıra dağların arasından yarıb keçən çay vadisi

**water-gas** [ˈwɔ:təˈgæs] *n kim*. su qazı, buxar

**water-gate** [ˈwɔ:təgeɪt] *n* **1**. sürgü *(şlyüzdə)*; **2**. *tar*. darvaza *(qəsrdə, şəhərdə)*

**water-gauge** [ˈwɔ:təgeɪdʒ] *n* suölçən *(sərf olunan suyun miqdarını göstərən cihaz)*

**water-glass** [ˈwɔ:təgla:s] *n* **1**. su stəkanı; **2**. şüşə vaz *(gül üçün)*; **3**. su saatı; **4**. suölçən şüşə; **5**. *kim*. həll olan/əriyən şüşə

**water-hammer** [ˈwɔ:tə,hæmər] *n tex*. hidravlik zərbə

**water-hen** [ˈwɔ:təhen] *n zool*. su toyuğu

**water-ice** [ˈwɔ:tərˈaɪs] *n* **1**. meyvə şirəsindən hazırlanan dondurma, meyvəli dondurma; **2**. çay/dəniz buzu

**watering** [ˈwɔ:tərɪŋ] *n* **1**. sulama, suvarma, su vermə; **2**. su qatma; **3**. naxır bulağı, suvat

**watering-can** [ˈwɔ:tərɪŋkæn] *n* = **water-can**

**watering-cart** [ˈwɔ:tərɪŋka:t] *n* = **water-cart**

**watering-place** [ˈwɔ:tərɪŋpleɪs] *n* **1**. naxır bulağı, suvat *(malların su içdiyi yer)*; **2**. mineral suları olan kurort; **3**. dəniz kurortu

**watering-pot** [ˈwɔ:tərɪŋpɔt] *n* = **water-can**

**water-jacket** [ˈwɔ:tə,dʒækɪt] *n tex*. sukeçirməyən köynək

**water-lawyer** [ˈwɔ:tə,lɔ:jər] *n zaraf*. akula *(yırtıcı balıq)*

**waterless** [ˈwɔ:təlɪs] *adj* susuz; ~ **toilet** susuz/suyu olmayan tualet/ayaqyolu

**water-level** [ˈwɔ:tə,levl] *n* **1**. su səviyyəsi; yeraltı suların səviyyəsi; **2**. *tex*. vaterpas, taraz *(səthin üfüqi vəziyyətini yoxlamaq üçün cihaz)*

**water-lily** [ˈwɔ:tə,lɪlɪ] *n bot*. suzanbağı, ağ suzanbağı

**water-line** [ˈwɔ:təlaɪn] *n dən*. su kəsimi, su xətti *(gəminin alt hissəsinin normal halda suya nə qədər batdığını göstərən xətt)*

**waterlog** [ˈwɔ:təlɔg] *v* **(-gg-)** **1**. su basmaq, daşıb basmaq, su ilə doldurmaq *(gəmini və s.)*; **2**. bataqlaşdırmaq; **3**. canına hopmaq, canına çəkmək *(suyu)*; **4**. xarab olmaq, korlanmaq *(suyun çoxluğundan)*

**waterlogged** [ˈwɔ:təlɔgd] *adj* **1**. yarı su basmış, su altında qalmış; **2**. bataqlaşmış; **3**. canına su hopmuş/çəkmiş

**water-main** [ˈwɔ:təmeɪn] *n* su kəməri magistralı/ana xətti

**waterman** [ˈwɔ:təmən] *n (pl* **-men** [-mən]) **1**. qayıqçı *(adamları qayıqla bir tərəfdən digərinə aparan şəxs)*; **2**. avarçı, avarçəkən; **3**. yanğınsöndürən

**watermanship** [ˈwɔ:təmənʃɪp] *n* yaxşı avar çəkmə bacarığı

**watermark[1]** [ˈwɔ:təma:k] *n* **1**. suyun səviyyəsini qeyd etmə; **2**. su işarəsi *(kağızda)*; **3**. *dən*. dərinləşməni göstərən qeyd

**watermark[2]** [ˈwɔ:təma:k] *v* su işarələri etmək *(kağızda)*

**water-meadow** [ˈwɔ:tə,medou] *n* çaybasar çəmən

**water-melon** [ˈwɔ:tə,melən] *n bot*. qarpız

**water-meter** [ˈwɔ:tə,mi:tər] *n* suölçən *(cihaz)*

**water-mill** [ˈwɔ:təmɪl] *n* su dəyirmanı

**water-nymph** [ˈwɔ:təˈnɪmf] *n* supərisi *(yunan əsatirində)*

**water-oak** [ˈwɔ:təˈouk] *n bot*. qara palıd

**water-parting** [ˈwɔ:tə,pa:tɪŋ] *n coğr*. suayırıcı

**water-pipe** [ˈwɔ:təpaɪp] *n* su kəməri/borusu

**water-plane** [ˈwɔ:təpleɪn] *n* hidroplan

**water-plant** [ˈwɔ:tə,pla:nt] *n bot*. yosun

**water-point** [ˈwɔ:təpɔɪnt] *n* su təchizatı məntəqəsi

**water-polo** [ˈwɔ:tə,poulou] *n id*. vaterpolo, su polosu *(suda oynanılan top oyunu)*

**water-power** [ˈwɔ:tə,pauər] *n* **1**. hidroenerji; ~ **plant** su-elektrik stansiyası, hidroelektrostansiya

**water-pox** [ˈwɔ:təpɔks] *n tib*. suçiçəyi

**waterproof[1]** [ˈwɔ:təpru:f] *n* sukeçirməyən plaş; sukeçirməyən parça

**waterproof[2]** [ˈwɔ:təpru:f] *adj* suyadavamlı, sukeçirməyən

**waterproof[3]** [ˈwɔ:təpru:f] *v* suyadavamlı etmək, sukeçirməyən etmək

**water-pump** [ˈwɔ:təpʌmp] *n* su nasosu

**water-quake** [ˈwɔ:təkweɪk] *n* sualtı zəlzələ

**water-ram** [ˈwɔ:təræm] *n tex*. hidravlik taran *(texnikada işlədilən böyük, ağır toxmaq şəklində qurğu)*

**water-rat** [ˈwɔ:təræt] *n* **1**. su siçovulu; **2**. *məc*. gəmi siçovulu *(dənizçi haq.)*; **3**. *sl*. oğru *(tərsanələrdə və s. oğurluq edən)*; **4**. *sl*. liman polisi

**water-rate** [ˈwɔ:təreɪt] *n* su haqqı, su üçün haqq vermə

**water-repellent** [ˈwɔ:tərɪˈpelənt] *n* = **waterproof[1]**

**water resistance** [ˈwɔ:tərɪˈzɪstəns] *n* suyadavamlılıq, rütubət keçirməməzlik, rütubət keçirməmə

**waterscape** [ˈwɔ:təskeɪp] *n* **1**. çay/dəniz mənzərəsi; **2**. *rəs*. marina *(dəniz mənzərəsini təsvir edən şəkil)*

**water-seal** ['wɔ:təsi:l] *n tex.* hidravlik süngər/rəzə
**water-serpent** ['wɔ:tə.sə:pnt] *n arx.* suilanı
**water-service** ['wɔ:tə.sɔ:vɪs] *n* su təchizatı, su ilə təchiz etmə
**water-shed** ['wɔ:təʃed] *n* **1.** suayırıcı; **2.** çay hövzəsi
**water-sick** ['wɔ:təsɪk] *adj* bataqlaşmış *(yer, torpaq haq.)*
**water-side¹** ['wɔ:təsaɪd] *n* **1.** suya doğru olan tərəf; **2.** (**the** ~) sahil
**water-side²** ['wɔ:təsaɪd] *adj* sahildə yerləşən
**water-skin** ['wɔ:təskɪn] *n* su tuluğu
**water-skis** ['wɔ:təski:z] *n* su xizəkləri
**water-snake** ['wɔ:təsneɪk] *n* suilanı
**water-soak** ['wɔ:təsouk] *v* suda islatmaq
**water-softener** ['wɔ:tə.sɔfnəʳ] *n* suyu təmizləmək üçün dərman və ya maşın
**water-soluble** ['wɔ:tə.sɔljubl] *adj* suda həll olunan
**water-souchy** ['wɔ:tə.su:ʃɪ] *n asp.* öz şirəsində bişən balıq
**waterspout** ['wɔ:tə.spaut] *n* **1.** su borusu, su novu; **2.** su burulğanı; **3.** leysan
**water-sprayer** ['wɔ:tə.spreɪəʳ] *n* su püskürdən/tozlandıran *(cihaz)*
**water-supply** ['wɔ:tə.səplaɪ] *n* su təchizatı, su ilə təmin etmə
**water-table** ['wɔ:tə.teɪbl] *n* **1.** su səthi; **2.** yeraltı suyun səviyyəsi; **3.** *mem.* tavadaşı, sal daşı
**water-tank** ['wɔ:tə.tæŋk] *n* **1.** rezervuar; **2.** çən, bak *(su və s. üçün böyük qab)*
**water-tap** ['wɔ:tətæp] *n* su kranı
**watertight** ['wɔ:tətaɪt] *adj* **1.** sukeçirməyən; hermetik; ~ **boots** sukeçirməyən çəkmələr; **2.** təkzibolunmayan, təkzibedilməz, tamamilə əsaslı *(nəzəriyyə və s.)*; **3.** tamamilə aydın/aşkar, iki cür izah oluna bilməyən *(hüquqi sənəd və s.haq.)*; *The will is watertight Vəsiyyət bütün hüquq qaydaları əsasında tərtib olunmuşdur*
**water-tower** ['wɔ:tə.tauəʳ] *n tex.* su qülləsi
**water-trough** ['wɔ:tətrɔf] *n* təknə *(heyvan və ya quşlara su vermək üçün)*
**water-wave** ['wɔ:təweɪv] *n* **1.** güclü dalğa, su dalğası, ləpə *(dənizdə)*; **2.** soyuq zavivka, burdurulmuş saç
**water-way** ['wɔ:təweɪ] *n* **1.** su yolu; **inland/international** ~ daxili/beynəlxalq su yolu; **2.** gəmi işləyə bilən yol, gəmiçiliyə yararlı istiqamət, farvater *(gəmi keçə bilən yer)*
**water-weed** ['wɔ:təwi:d] *n bot.* yosun
**water-wheel** ['wɔ:tə.wi:l] *n* pər *(su dəyirmanında)*
**water-wings** ['wɔ:təwɪŋz] *n* xilasetmə kəməri *(üzməyə təzə başlayanlar və s. üçün)*
**water-witch** ['wɔ:təwɪtʃ] *n* supərisi
**waterworks** ['wɔ:təwə:ks] *n (tək və cəmdə eyni işlənir)* **1.** su nasosu stansiyası; su təchizatı sistemi; **2.** su tikililəri *(fəvvarə, fontan)*;
◊ **to be on the** ~ *d.d.* ağlamaq, göz yaşı tökmək

**watery** ['wɔ:tərɪ] *adj* **1.** sulu; yaş, nəm; **2.** duru *(yemək haq.)*; ~ **soup** duru sup; ~ **tea** rəngsiz çay; **3.** *məc.* solğun, məzmunsuz; zəif *(hiss, dil və s. haq.)*; **4.** yağışlı; ~ **cloud** yağışlı bulud; **5.** yaşlı, yaşla dolu *(göz haq.)*; ~ **eyes** yaşlı gözlər;
◊ ~ **grave/death** batmaq nəticəsində ölüm; dənizdə baş verən ölüm
**watt** [wɔt] *n fiz.* vatt *(elektrik ölçü vahidi)*
**wattle¹** [wɔtl] *n* I sırğa *(quşlarda)*; saqqal *(xoruzda, hinduşkada)*
**wattle** [wɔtl] *n* II hörmə çəpər, hörgü; ~ **and daub** daxma, palçıq ev, daxal
**wattle** [wɔtl] *n* III *bot.* mimoza; küsdüm ağacı; Avstraliya akasiyası
**wattle²** [wɔtl] *v* **1.** hörmək *(çəpər və s.)*; **2.** çubuqdan/ qamışdan hörmək
**wattled** ['wɔtld] *adj* I hörmə, hörülmüş; ~ **fence** hörmə çəpər/hasar
**wattmeter** ['wɔt.mi:təʳ] *n fiz.* vattmetr *(cihaz)*
**waul** [wɔ:l] *v* miyoldamaq; qışqırmaq, bağırmaq, çığırmaq
**wave¹** [weɪv] *n* **1.** dalğa; güclü ləpə; *The waves crashed against the rocks Dalğalar qayalara çırpıldı; The little boat vanished beneath the waves Kiçik qayıq dalğaların altında yox oldu*; **2.** əl etmə, əlini yelləmə; *With a wave of the hand he was gone Əlini yelləyə-yelləyə o çıxıb getdi*; **3.** artım, yüksəliş, coşğunluq, çılğınlıq; **a ~ of indignation** qəzəb coşğunluğu/çılğınlığı; bərk qəzəblənmə; **a ~ of enthusiasm** ruh yüksəlişi; **a crime** ~ cinayətkarlığın artması/yüksəlməsi; **4.** qıvrım, buruq; *She has a natural wave in her hair Onun saçı anadangəlmə qıvrımdır/buruq-buruqdur/ dalğavarıdır*; **5.** zavivka, burmasaç, burdurulmuş saç *(həm də* **hair** ~*)*; **to get a** ~ saçını burdurmaq/zavivka etdirmək; **6.** *fiz.* rəqs, rəqs etmə; **7.** *fiz.* dalğa; **seismic** ~ seysmik dalğa; **air/explosion/sound** ~ hava/partlayış/səs dalğası; **8.** *rad.* dalğa, siqnal, işarə; **long/medium/short** ~**s** uzun/orta/qısa dalğalar; **9.** *hərb.* hücum edən qoşun/desant/eşelon dəstəsi; **to attack in** ~**s** eşelonla hücum etmək;
◊ **to lash the** ~**s** səmərəsiz mübarizə aparmaq, havayı yerə baş sındırmaq/işləmək/çalışmaq
**wave²** [weɪv] *v* **1.** dalğalanmaq *(bayraq, zəmi, tarla və s.)*; yellənmək *(budaq və s.)*; *The flag waved in the breeze Bayraq xəfif küləkdə dalğalandı*; **2.** yelləndirmək, dalğalandırmaq; oynatmaq; **to ~ a banner** bayrağı yellətmək/dalğalandırmaq; **to ~ a sword** qılınc oynatmaq; **3.** əl etmək, yelləmək *(dəsmal, əl və s. ilə)*; **to ~ a farewell** vidalaşarkən əl etmək; **to ~ a person nearer** əl işarəsi ilə bir şəxsi yanına çağırmaq; *Wave to your father Atana/Atanıza əl et/edin; The President waved at the crowd from the steps Prezident pilləkəndən izdihama əl etdi*; **4.** burulmaq, qıvrılmaq *(saç haq.)*; *Her hair waves naturally Onun saçı anadangəlmə qıvrımdır/buruqdur*; **5.** burmaq, zavivka etmək *(saçı)*;



*She has had her hair waved O, saçını burdurub /zavivka etdirib*; **to ~ aside** nəzərə almamaq; rədd etmək; başdan etmək, fikir verməmək, laqeyd yanaşmaq; *My reservations about the plan were waved aside Mənim plan haqqındakı təshihlərimə/düzəlişlərimə fikir verilmədi*; **to ~ away 1)** bir kəsə uzaqlaşmaq işarəsi vermək; **2)** *məc.* başdan eləmək; fikir verməmək *(bir şeyə)*
**waved** [weɪvd] *adj* dalğavarı; qıvrım, buruq, burulmuş *(saç haq.)*
**waved-guide** ['weɪvdgaɪd] *n rad.* dalğaötürən *(qısa məsafələrlə radio dalğalarını ötürən cihaz)*
**wave-length** ['weɪvleŋθ] *n fiz.* dalğanın uzunluğu;
◊ **to be on a different /the same** ~ müxtəlif cür/eyni cür düşünmək; müxtəlif/eyni əqidədə olmaq; *I'm afraid he and I are on totally different wavelengths Deyəsən o və mən tamamilə başqa-başqa əqidədəyik*
**wavelet** ['weɪvlɪt] *n* zəif su dalğası; **gentle ~ on a sandy shore** qumlu dəniz sahilində zəif su dalğası
**wave-off** ['weɪv'ɔ(:)f] *n av.* enməni qadağan etmə
**waver** ['weɪvəʳ] *v* **1.** alovlanmaq, dalğalanmaq *(alov və s.)*; *The flame wavered and went out Alov dalğalandı və söndü*; **2.** əsmək, titrəmək; *His voice wavered Onun səsi titrədi*; **3.** tərpənmək, hərəkətə gəlmək *(qoşun haq.)*; *The front line wavered under fire Ön xətt atəş altında hərəkətə gəldi/tərpəndi*; **4.** dalğalanmaq, yellənmək *(bayraq və s. haq.)*; **banners ~ing in the wind** küləkdə dalğalanan bayraqlar; **5.** tərəddüd etmək; qətiyyətsizlik göstərmək; **to ~ between two opinions** iki fikir/nöqteyi-nəzər arasında tərəddüd etmək; *He wavered between accepting and refusing O qəbul etməklə imtina etmək arasında tərəddüd etdi; He felt his courage begin to waver O hiss etdi ki, onun cəsarəti/şücaəti zəifləməyə başlayır*
**wavering¹** ['weɪvərɪŋ] *n* qətiyyətsizlik, qərarsızlıq; tərəddüd etmə
**wavering²** ['weɪvərɪŋ] *adj* səbatsız, dayanıqsız; tərəddüd edən
**wavy** ['weɪvɪ] *adj* **1.** dalğavarı, qıvrım, buruq *(saç haq.)*; *She has wavy hair Onun qıvrım saçı var*; **2.** təlatümlü; coşğun, bərk dalğalı *(dəniz haq.)*; **3.** tərəddüd edən; səbatsız, qətiyyətsiz; **4.** *tex.* riflənmiş, kələ-kötür, qotur; ~ **lines** dalğavarı/kələ-kötür xətlər;
◊ ~ **breath/respiration** *tib.* kəsik-kəsik/qırıq-qırıq nəfəs alma
**wax¹** [wæks] *n* I **1.** mum *(arı)*; **mineral** ~ mineral mum; **2.** parafin *(neftdən alınan mumabənzər ağ maddə)*; **3.** qulaq çirki; ~ **in the ears** qulaqda çirk;
◊ **like ~ in smb.'s hand** bir kəsin əlində mum/oyuncaq kimi olmaq; *He is wax in her hands O tamamilə onun əlində oyuncaqdır/ona tabedir*
**wax** [wæks] *n* II *d.d.* qeyz, acıq, qəzəb tutması; **to be in a** ~ azğınlaşmaq, bərk özündən çıxmaq, bərk qəzəblənmək; **to get into a** ~ qudurmaq; cinlənmək, qızmaq, özündən çıxmaq; *That put him in a wax Bu onu özündən bərk çıxartdı/cinlətdi*
**wax²** [wæks] *v* I **1.** mumlamaq; **to ~ thread** sapı mumlamaq; **2.** parafinləmək; **to ~ the floor/the furniture/the car** döşəməni/mebeli/maşını parafinlə silmək/sürtmək
**wax** [wæks] *v* II **1.** çıxmaq, doğmaq *(ay haq.; həm də məc.)*; *The moon waxes and wanes each month Ay hər ay çıxır və batır*; **2.** artmaq, böyümək; **to ~ in size and strength** böyümək və möhkəmlənmək; *Throughout history empires have waxed and waned Tarix boyunca imperiyalar yüksəlmiş və tənəzzül etmişlər*; **3.** *arx.* böyümək *(uşaq haq.)*; **4.** keçmək, ötüb keçmək; *Time waxed on Vaxt ötüb keçdi*; **5.** *Bağlayıcı fel kimi*: olmaq, əmələ gəlmək; *The king waxed merry Kral şənləndi; He waxed eloquent as he described his plans O öz planlarını təsvir edərkən daha gözəl/bəlağətli danışırdı*; **to ~ angry** bərk hisrlənmək, cinlənmək; **to ~ fat** kökəlmək; **to ~ deaf** kar olmaq, karlaşmaq; **to ~ old feeble** qocalıb əldən düşmək/zəifləmək
**waxcloth** ['wæksklɔθ] *n* **1.** linolium; **2.** müşəmbə
**waxed** [wækst] *adj* **1.** mumlanmış, mumla örtülmüş; ~ **thread** mumlanmış sap; **2.** parafinlənmiş; ~ **floor** parafinlənmiş döşəmə
**waxen** ['wæksən] *adj* **1.** mum kimi, mumaoxşar; **2.** solğun, rəngsiz, rəngi qaçmış; **a ~ face** solğun/rəngi qaçmış sifət/üz; **3.** *arx.* mum; ~ **image** mum fiqur
**wax-paper** ['wækspeɪpəʳ] *n* yağkeçirməyən/ yağburaxmayan kağız
**waxwork** ['wækswə:k] *n* **1.** mumdan yapma; **2.** mumdan heykəl tökmə/fiqur yapma; ~ **figures** mumdan yapılmış fiqurlar; **3.** *pl* panoptikum; mum heykəllər qalereyası
**waxy** ['wæksɪ] *adj* **1.** mum, mumlu, mumdan olan; **2.** mumaoxşar; **3.** *məc.* üzüyola, yumşaq; üzüyumşaq; ~ **person** üzüyumşaq/üzüyola adam; **4.** mumlanmış
**way¹** [weɪ] *n* **1.** yol; *The way was rough Yol kələ-kötür idi*; **a ~ across the fields** çöllərdən keçib gedən yol; **a covered ~ between two buildings** iki bina arasında üstü örtülü yol; *Which is the best/shortest way to town? Şəhərə ən yaxşı/qısa yol hansıdır? He asked me the way to London O məndən Londona gedən yolu soruşdu; We had to pick our way along the muddy track Biz öz yolumuzu palçıqlı cığırdan salmalı olduq; Which is the way in/out of the library? Kitabxanaya giriş/çıxış yolu hansıdır? If you lose your way, ask a policeman Yolunu itirsən, polisdən soruş*; **a ~ to the forest** meşəyə gedən yol; **on the** ~ yolda; **on the ~ home 1)** evə gedərkən; **2)** yolüstü; *I met him on the way home Mən ona evə gedərkən rast*

gəldim; **back** ~ doləma/dolanbac yol; **to go *one's*** ~ yola düşmək, getmək; **to be on *one's*** ~ yolda olmaq; *They are on the way Onlar yoldadır, Onlar artıq yola düşüblər*; **to get out of *smb.'s*** ~ yoldan çəkilmək; mane olmamaq; *Get out of my way! Yolumdan çəkil!* **to make ~ for *smb./smth.*** bir kəsə/şeyə yol vermək, bir kəsə/bir şeyə öz yerini göstərmək; *The old houses were knocked down to make way for a new office development Təzə tikililərin inkişafına yol açmaq üçün köhnə tikililər söküldü/uçuruldu*; **to take *one's*** ~ getmək, varıb getmək; **to lead the** ~ irəlidə getmək; nümunə göstərmək; başçı olmaq, aparmaq, başçılıq etmək; **to see *one's*** ~ öz işini bilmək, necə hərəkət edəcəyini bilmək; *Now I see my way İndi mən nə edəcəyimi bilirəm*; **to try *one's* own** ~ öz bildiyi kimi hərəkət etmək; **to have/to get *one's* own** ~ özü dediyini etmək, özü bildiyi kimi etmək; *She had it her own way in the end Sonda o öz istədiyinə nail oldu; Have it your own way Özün bildiyin kimi et/edin*; **to be in the ~ of doing *smth.*** bir şeyi etmək ərəfəsində olmaq; **out of the** ~ uzaq, ucqar, əldən-ayaqdan uzaq; *This village is very much out of the way Bu kənd yoldan çox uzaqdır*; 2. istiqamət, tərəf, yol; *Look this way Bu tərəfə bax; This way please Bura zəhmət çək/çəkin; Are you going my way? Yolumuz birdirmi? You have got your hat on the wrong way round Sən/Siz şlyapanı/ şlyapanızı tərsinə qoymusan/qoymusunuz; If the tree falls that way, it will damage the house Ağac o tərəfə yıxılsa, evə zərər vuracaq/evi zədələyəcək; Look both ways before crossing the road Yolu keçməzdən əvvəl hər iki tərəfə bax/baxın*; 3. məsafə; *It's only a little way to the station Vağzal lap yaxındadır; We are a long way from the coast Biz sahildən uzaqdayıq; It is a long way from here (off) Buradan uzaqdadır*; **a long ~ from home** vətəndən uzaq; *It is only a little way to the town Şəhərə yol lap yaxındır*; ~ **from ... to** ...dan/...dən -a/-ə, (-ya/-yə) kimi **all the ~ from the Atlantic to the Pacific** Atlantik okeanından Sakit okeana kimi; 4. irəliyə getmə, qabağa keçmə; irəli yeriş; **to make *one's* ~ to/towards 1)** irəli getmək, qabağa keçmək; *Passengers are requested to make their way to the exit doors Sərnişinlərdən xahiş olunur ki, çıxış qapılarına yaxınlaşsınlar*; 2) cəmiyyətdə və s. özünə yer tutmaq, mənsəbə çatmaq, böyümək, artmaq (*həm də* **to make *one's* ~ in the world**); *She's finding it hard to make her way in a business dominated by men Ona kişilərin üstünlük təşkil etdikləri biznes işində özünə yer etmək /yol açmaq çox çətindir*; **to make the best of *one's*** ~ tez getmək, tələsmək; **to have ~ on** irəli getmək, irəli hərəkət etmək (*gəmi, avtomobil və s. haq.*); **under** ~ *dən.* hərəkət zamanı, gedə-gedə; *Preparations are now under way İndi hazırlıq gedir*; **to get under ~ 1)** *dən.* üzmək, yola düşmək, sahildən aralanmaq; 2) *məc.* həyata keçirmək, icra etmək; **to be well under** ~ çox irəli getmək; **to gather** ~ sürət vermək, işə salmaq; **to lose** ~ sürətini azaltmaq (*gəmi haq.*); 5. üsul, metod; qayda, tövr, tərz; ~ **of living** yaşayış tərzi; *I will find a way to do it Mən onu etmək üçün bir vasitə/bir üsul tapacam; There are several ways of doing it Onu etməyin müxtəlif üsulları/yolları var; She showed them the (right) way to do it O onlara onu etməyin düz yolunu göstərdi*; **to my ~ of thinking** mənim fikrimcə; **one ~ or another** bu və ya digər yolla/üsulla; nə vasitə ilə olur-olsun; *He will do it one way or another Necə olur-olsun/Hansı vasitə ilə olur olsun, o bunu edəcək*; **the other** ~ başqa/özgə cür; **~s and means 1)** üsul və vasitələr; 2) pul tapma vasitə və yolları; **to put *smb.* in the ~ of doing *smth.*** bir kəsə bir şeyi etməyə imkan yaratmaq; **to see *one's* ~ clear/to doing *smth.*** bir şeyi etməyin yolunu aydın bilmək; **to have a ~ with *smb.*** bir kəslə yola getmək/ümumi dil tapmaq; **to speak in a careless** ~ saymazyana danışmaq; **in the same** ~ eyni cür, eyni yolla; **her ~ of doing her hair** onun saçını düzəltmə tərzi; 6. adət, vərdiş; xasiyyət, xüsusiyyət, xarakter; *It is not his way to be generous Səxavətli olmaq onun xasiyyəti deyil; It is not my way to desert people in misfortune Yaman gündə adamları atıb getmək/qaçmaq mənim adətim deyil*; **to stand in the ancient ~s** yeniliklərin əleyhinə olmaq, köhnə adətlərin tərəfində olmaq; 7. forma, tərz; **to live in a great** ~ firavan yaşamaq; *Don't take offence – it is only his way İnciməyin, bu onun danışıq tərzidir*; **the American ~ of life** Amerika həyat tərzi; *They eventually came round to our way of thinking Onlar nəhayət bizim düşüncə tərzimizlə hesablaşmalı oldular; He has a pleasant way of speaking Onun çox xoş/gözəl danışıq tərzi var*; 8. *d.d.* sahə; məşğuliyyət; *He is in the grocery /in the drapery way O, ərzaq/parça dükanında işləyir; Hunting is not/does not come/does not fall in my way Ov etmək mənim məşğuliyyətim deyil; Such things never come /fall/lie in my way Belə şeylər heç vaxt mənə rast gəlmir*; 9. vəziyyət, hal; **in a bad** ~ pis vəziyyətdə/halda; *His health is in a bad way Onun səhhəti pis vəziyyətdədir; The business is in a fine way Biznes tərəqqidədir, İşlər əla vəziyyətdədir*; 10. *d.d.* həyəcan, təşviş; *She is in a terrible way O çox həyəcanlıdır, O bərk təşviş içərisindədir*; **to be in a great** ~ həyəcanlanmaq; 11. cəhət, məna; **bad in every** ~ hər cəhətdən pis; **in a** ~ müəyyən mənada; **in many ~s** çox cəhətdən; *The work has been done well in one way Müəyyən mənada iş yaxşı edilib/yerinə yetirilib; Not a bad fellow in some way Müəyyən mənada /Ümumən o, pis oğlan deyil; A plan is good in every way Plan hər cəhətdən yaxşıdır*;

◊ **across/over the** ~ yolun o biri tərəfində; *My sister lives over the way Mənim bacım yolun o*



*tayında yaşayır*; **all the ~, the whole ~ 1)** bütün yol boyu; *She smoked non-stop all the way to London O, Londona gedərkən bütün yol boyu dayanmadan papiros çəkdi*; 2) tamamilə; *We'll support you all the way Biz səni/sizi tamamilə/var qüvvəmizlə dəstəkləyəcəyik*; **to be born this** ~ bu cür doğulmaq, xasiyyəti belə olmaq; *I can't change, I was born this way Mən dəyişə bilmərəm, mən belə doğulmuşam*; **by ~ of ...** xatirinə, məqsədilə, əlaqədar, yana; zarafat xatirinə; **to make inquiries by ~ of learning the truth** həqiqəti öyrənmək məqsədilə sorğu-sual aparmaq; *What are you thinking of doing by way of a holiday this year? Bu il bayramla əlaqədar sən/siz nə etməyi düşünürsən /düşünürsünüz?*; **by the** ~ yeri gəlmişkən; *What did you say your name was, by the way? Yeri gəlmişkən, sənin/sizin adın/adınız nə oldu?* **to be in the** ~ mane olmaq, maneçilik törətmək; *Tell that boy not to get in the way O oğlana deyin ki, mane olmasın; He is in the way of doing a foolish thing O nə isə bir axmaq şey görməyə hazırlaşır*; **to get into the ~ of doing *smth.*** öz bildiyini etmək; **to get/to have *one's* own** ~ öz məqsədinə çatmaq; *She always gets her own way in the end O həmişə axırda öz məqsədinə nail olur/çatır*; **to give ~ 1)** güzəştə getmək; təslim olmaq, qabağında dura/dayana bilməmək; *We must not give way to their demands Biz onların tələblərinə güzəşt etməməliyik*; 2) yol vermək; *Give way to traffic coming from the right Sağ tərəfdən gələn maşınlara/nəqliyyata yol ver/verin*; 3) qapılmaq (*məyusluğa və s.*); *She gave way to despair O, məyusluğa qapıldı*; 4) xarab olmaq, korlanmaq, dağılmaq, çürümək; sınmaq; *The floorboards were rotten and finally gave way Döşəmə taxtaları çürümüşdü və nəhayətdə sındı/dağıldı*; 5) düşmək (*aksiya haq.*); **to give ~ to *smth.*** bir şeylə əvəz olunmaq, öz yerini bir şeyə vermək; *The storm gave way to bright sunshine Fırtına parlaq günəşlə əvəz olundu*; **to make ~ (for)** yol/yer vermək; *All traffic has to make way for a fire-engine Bütün nəqliyyat yanğınsöndürən maşına yol verməlidir*; **to make (one's) ~, to fight *one's*** ~ özünə yol açmaq; *He has his way to make O özünə yol açmalıdır*; **one ~ or the other** bu və ya digər yolla/hər nə olursa olsun; *No two ways about it Bu haqda iki fikir ola bilməz*; **out of the** ~ qeyri-adi, fövqəladə; *The picture is nothing out of the way Bu şəkildə qeyri-adi heç bir şey yoxdur; He has done nothing out of the way yet O hələ fövqəladə/qeyri-adi heç bir şey etməyib*; **to put *smb.* in the ~ of *smth.*** bir kəsə bir şeydə imkan yaratmaq; **to go the ~ of all flesh/of all the earth** ölmək, dünyasını dəyişmək; **to go out of *one's* ~ ..., to put oneself out of the ~ ...** var qüvvə ilə çalışmaq (*başqasına kömək etmək, əl uzatmaq məqsədilə*); *She went out of the way to please her future mother-in-law O, gələcək qayınanasına xoş gəlmək üçün var qüvvəsilə çalışırdı; When we moved in our neighbours went out of their way to help us Biz köçəndə, qonşularımız bizə bacardıqları qədər kömək etdilər*; **to go *smb.'s* ~ 1)** bir kəslə yolu eyni olmaq, bir kəslə eyni yolla getmək; *I'm going your way, so I can give you a lift Bizim yolumuz birdir, səni maşına götürə bilərəm*; 2) xeyrinə işləmək (*iş, hadisə*); *Things certainly seem to be going our way Əlbəttə, hadisələr bizim xeyrimizə işləyir*; **to put *smb.* out of the** ~ bir kəsi aradan götürmək/ öldürmək; **to come *smb.'s*** ~ bir kəsə rast gəlmək (*həyatda*); ◊ *The longest way round is the shortest way home at. söz.* ≅ *Ehtiyatlı igidin anası ağlamaz*; **to have a ~ with oneself** məlahətli /cazibədi olmaq; *The girl has a winning way with her Qızın cazibəmə qüvvəsi var, Qız cazibədicidir*; **to have a ~ with *smb.*** bir kəslə ümumi dil tapmaq; **to have a ~ with difficult children** çətin uşaqlarla dil tapmaq; *He has a way with his car O, maşınının dilini bilir*; **in a big/small** ~ çox/az dərəcədə; *He's got himself into trouble in a big way O özünü bərk bəlaya salıb; She collects antiques in a small way O, qədim /antiq şeyləri az toplayır*; ~ **out** vəziyyətdən çıxış yolu; **~s and means 1)** üsullar/yollar və vasitələr; **~s and means to do *smth.*** bir şey etməyin yolları və vasitələri; 2) büdcə məsələsi; **the Ways and Means Committee 1)** Britaniya parlamentinin büdcə komissiyası; 2) ABŞ konqresinin daimi büdcə komissiyası

**way²** [weı] *adv d.d.* uzaqda, müəyyən məsafədə; ~ **behind** çox arxada, uzaqda; ~ **back** çoxdan; *That happened way back in the $19^{th}$ century Bu, çoxdan hələ 19-cu əsrdə baş verib*; ~ **ahead** xeyli qabaqda/ irəlidə; *The runner was way ahead of his opponents Qaçışçı öz rəqiblərini xeyli qabaqladı*; ~ **over** həddən artıq; **to go ~ over *one's* budget** büdcədən artıq xərcləmək, israfçılıq etmək

**way-bill** ['weıbıl] *n* 1. sərnişinlərin siyahısı; 2. marşrut (*turist*); 3. *amer.* faktura (*buraxılan, göndərilən malların siyahısı*); 4. yol vəsiqəsi

**wayfarer** ['weı.feərə$^r$] *n* səyyah, yolçu; piyada, zəvvar

**wayfaring¹** ['weı.feərıŋ] *n* səyahət etmə, gəzmə; səyyahlıq, zəvvarlıq

**wayfaring²** ['weı.feərıŋ] *adj* səyyah, səyahət edən, gəzərgi, gəzən

**waygoing** ['weı.go(u)ıŋ] *adj* yola düşən, gedən, vidalaşan

**waylay** ['weıleı] *v* (*pt. pp* **waylaid** [-leıd]) 1. güdmək, pusmaq; tələ/pusqu qurmaq; *The travellers were waylaid by bandits Quldurlar səyahətçilərə tələ/ pusqu qurmuşdular*; 2. kimi isə yaxalamaq; *She waylaid me in the corridor and asked if she could speak to me in private O məni dəhlizdə yaxaladı və soruşdu ki, mənimlə məxfi söhbət edə bilərmi?*

**way-leave** [ˈweɪli:v] *n hüq.* **1.** keçmə/gediş hüququ; *(başqasının torpağından)*; kabel, truba və s. çəkmə hüququ; **2.** uçmaq icazəsi *(başqasının ərazisi üzərindən)*; **3.** keçmə/getmə hüququ üçün ödəniş

**way-man** [ˈweɪmən] *n (pl* **-men** [-mən]) *d.y.* yol baxıcısı

**way-mark** [ˈweɪma:k] *n* yol işarəsi

**way-out** [ˈweɪˈaut] *adj* **1.** *amer. jarq.* qeyri-adi, qəribə, gözəl; ~ **clothes/ideas** qeyri-adi paltar/fikirlər; **2.** yeni, müasir, təzə *(musiqi və s. haq.)*; **3.** uzaq

**way-passenger** [ˈweɪ.pæsɪndʒəʳ] *n amer.* dayanacaqdan kənar yerdə düşən/minən sərnişinlər *(tələbə görə)*

**ways** [weɪz] *n* adət, ənənə; vərdiş; *We all have our funny little ways Bizim hamımızın azacıq da olsa məzəli adətlərimiz var*

**wayside¹** [ˈweɪsaɪd] *n (adət. təkdə işlənir)* **1.** yolun kənarı/qırağı; **2.** *d.y.* dəmir yolunun ixtiyarında olan sahə

**wayside²** [ˈweɪsaɪd] *adj* yol üstündəki/qırağındakı/ kənarındakı; ~ **inn** yol qırağındakı kiçik mehmanxana; karvansara; ~ **weed** yol qırağındakı alaq otu; ~ **trees** yol qırağındakı ağaclar; ~ **cottages** yol kənarındakı daxmalar

**way signal** [ˈweɪ.sɪgnl] *n* yol işarəsi

**way station** [ˈweɪˈsteɪʃn] *n amer.* yarımstansiya; tələbat üzrə dayanacaq

**waythorn** [ˈweɪθɔ:n] *n bot.* ağtikan

**wayward** [ˈweɪwəd] *adj* **1.** inad, inadcıl, tərs, öz bildiyini edən, qeyri-itaətkar; dikbaş, şıltaq, itaətsiz; **a ~ son** dikbaş oğul; **a ~ child** şıltaq/inadcıl uşaq; **2.** dəyişkən, daimi olmayan; ~ **fate** tale dönüklüyü, tale şıltaqlığı; ~ **opinions** dəyişkən/səbatsız fikir/ nöqteyi-nəzərlər; **3.** yolunu itirən /azan; pis yola düşən, yolundan çıxan; ~ **minor** həddi-büluğa çatmamış cinayətkar; ~ **girl** həddi-büluğa çatmamış fahişə/qəhbə

**waywarden** [ˈweɪ.wɔ:dn] *n* şosse yolları baxıcısı/nəzarətçisi; yol nəzarətçisi

**way-worn** [ˈweɪwɔ:n] *adj* yorğun, əzgin, əldən düşmüş *(yolçu haq.)*

**wazir** [wa:ˈzɪəʳ] *n* vəzir

**WC** [.dʌblju:ˈsi:] *n* ayaqyolu, tualet

**W-day** [.dʌblju(:)ˈdeɪ] *n hərb.* desant çıxarma günü; desant tökmə günü

**we** [wi:] *pers. pron* **1.** biz; *We both thank you Biz ikimiz də sizə təşəkkür edirik; When shall we speak? Biz nə vaxt danışacağıq?*; **2.** biz *(məqalələrdə, elmi işlərdə və s. I-ci şəxs əvəzində işlənir)*; **3.** biz *(müəyyən məqsəd, sənət və s. ilə əlaqədar olan bir qrup adamı bildirmək üçün işlədilir); We, lawyers... Biz, vəkillər...*

**weak** [wi:k] *adj* (**-er, -est**) **1.** zəif; gücsüz; halsız; kövrək; ~ **point/spot** zəif yer/cəhət; ~ **muscles/ nerves/stomach** zəif əzələ/əsəb/mədə; ~ **sight** zəif görmə qabiliyyəti; *He is weak in English O, ingilis dilindən zəifdir; That bridge is too weak to carry heavy traffic O körpü ağır nəqliyyatın keçməsi üçün çox zəifdir/möhkəm deyil*; **2.** *məc.* iradəsiz, cəsarətsiz, aciz; **a ~ man** cəsarətsiz/iradəsiz adam; ~ **in spirit** ruhən zəif; **3.** səbatsız; əsassız; etibarsız, inandırıcı olmayan; ~ **logic** əsassız məntiq; ~ **excuse** əsassız üzrxahlıq; ~ **evidence** əsassız dəlil; **4.** zəif, açıq, duru; sıyıq; ~ **coffee** açıq kofe; ~ **tea** rəngsiz/açıq çay; **5.** *dilç.* zəif; ~ **verb/declension/ conjugation** zəif fel/hallanma/təsrif; **6.** *fon.* vurğusuz; zəif, ikinci dərəcəli *(vurğu haq.)*;

◊ ~ **knees** zəiflik, iradəsizlik, prinsipsizlik; ürəksizlik, cəsarətsizlik; ~ **in the head** ağıldan kəm, başdan xarab, gic; *You must be weak in the head if you believe that Əgər sən/siz ona inanırsansa/inanırsınızsa, ağıldan kəmsən/kəmsiniz*; **the ~ sex** zəif cins *(qadınlar haq.)*

**weak-brained** [ˈwi:kˈbreɪnd] *adj* ağıldan kəm, ağlıçatmayan, gictəhər; sarsaq; küt

**weaken** [ˈwi:k(ə)n] *v* **1.** zəiflətmək; əldən salmaq, üzmək; zəifləmək, əldən düşmək; *The disease weakened him Xəstəlik onu zəiflətdi/əldən saldı/üzdü; The fall in productivity has weakened the economy Məhsuldarlığın aşağı düşməsi iqtisadiyyatı zəiflədib*; **to ~ a blow** zərbəni zəiflətmək; *I have been weakened by illness Xəstəlik məni əldən salıb/zəifləldib*; **2.** azaltmaq, zəiflətmək; qırmaq; azalmaq; **to ~ *smb.'s* confidence/resolve** bir kəsin inamını/qətiyyətini qırmaq; **3.** qabağında dura bilməmək, təslim olmaq *(inam, xahiş və s.)*; dözə bilməmək *(xasiyyətə)*; yumşalmaq; *They have not yet agreed to our requests, but they are clearly weakening Onlar hələ də bizim xahişimizlə razılaşmayıblar, lakin açıq-aşkar yumşalırlar; She asked so many times that in the end we weakened and let her go O o qədər çox xahiş elədi ki, axırda biz onun xahişi qabağında dura bilmədik və onun getməyinə icazə verdik/onu buraxdıq*

**weakening** [ˈwi:knɪŋ] *adj* **1.** zəifləyən; **2.** zəiflədən; ~ **sound** *fon.* zəif/yox olan səs

**weak-eyed** [ˈwi:kaɪd] *adj* gözü zəif olan, zəif/pis görmə qabiliyyətinə malik olan

**weak-headed** [ˈwi:khedɪd] *adj* **1.** kəmağıl, ağlı zəif, başıboş; **2.** tez keflənən; **3.** iradəsiz

**weak-hearted** [ˈwi:kˈha:tɪd] *adj* **1.** ürəyiyumşaq; **2.** ağciyər, qorxaq, ürəksiz, cəsarətsiz

**weak-kneed** [ˈwi:kni:d] *adj* qorxaq, ağciyər, cəsarətsiz; qətiyyətsiz

**weakling** [ˈwi:klɪŋ] *n* **1.** zəif/iradəli adam; iradəsiz varlıq; **2.** iradəsiz/səbatsız adam

**weakly¹** [ˈwi:klɪ] *adj* **1.** zəif, arıq, sısqa, cansız *(bədən haq.)*; **2.** səbatsız, dayanıqsız *(mənəvi cəhətdən)*

**weakly²** [ˈwi:klɪ] *adv* zəifcəsinə, azacıq; **to smile** ~ azacıq gülümsəmək

**weak-minded** [ˈwi:kˈmaɪndɪd] *n* = **weak-headed** *(1-ci mənada)*



**weakness** [ˈwi:knɪs] *n* **1.** zəiflik; gücsüzlük; halsızlıq; kövrəklik; ~ **of character** xasiyyətin zəifliyi; ~ **of memory** yaddaş zəifliyi; **the ~ of old age** qocalıq halsızlığı; ~ **of mind** kəmağıllıq, ağıl zəifliyi; **the ~ of a wall** divarın kövrəkliyi/etibarsızlığı; **2.** çatışmazlıq, qüsur; kifayət olmama; **the ~ of knowledge** bilik çatışmazlığı; ~ **in scholarship** erudisiya çatışmazlığı/qüsuru; **structural** ~ struktur çatışmazlığı; *It's important to know your own strengths and weaknesses Adamın öz gücünü və çatışmazlığını bilməsi vacibdir*; **3.** qətiyyətsizlik, acizlik, cəsarətsizlik, zəiflik, iradəsizlik; ~ **in resistance** müqavimət zəifliyi; **4.** əsassızlıq, sübutsuzluq, dəlilsizlik; **the ~ of argument** dəlilin əsassızlığı/sübutsuzluğu; **5.** meyl etmə *(nəyəsə)*, zəiflik, təmayül; *His chief weakness is a fondness for the bottle Onun başlıca zəifliyi – içkidir/içkiyə meyl etməsidir; His main weakness is flattery Onun əsas zəifliyi yaltaqlığa sövq etməsidir; Candy is a weakness of mine Şirniyyat mənim ən zəif yerimdir*; **6.** aşağı düşmə, enmə, azalma *(bazarda, birjada qiymətlər haq.)*

**weak-sighted** [ˈwi:kˈsaɪtɪd] *adj* = **weak-eyed**

**weak-spirited** [ˈwi:kˈspɪrɪtɪd] *adj* ürəksiz, cəsarətsiz, qorxaq, ağciyər

**weak-willed** [ˈwi:kˈwɪld] *adj* zəif iradəli, iradəsiz

**weal¹** [wi:l] *n* I rifah, xoş güzəran; səadət, firavanlıq; **for the public/general ~** ümumi rifah/xoş güzəran naminə; **for the ~ of *smb.'s* soul** bir kəsin rifahı naminə; **in ~ and woe** xoşbəxtlikdə və bədbəxtlikdə, xoş gündə də, pis gündə də

**weal** [wi:l] *n* II çapıq, kəsik, yarıq; zolaq yeri *(qamçı zərbəsindən)*

**weal²** [wi:l] *v* zol-zol etmək *(qamçı ilə)*

**weald** [wi:ld] *n* **1.** *şair.* çöl, biyaban; **2.** çöl, çəmənlik

**wealth** [welθ] *n* **1.** zənginlik, var, var-dövlət; **a man of ~** zəngin/varlı adam; **intellectual ~** mənəvi zənginlik; *Nobody knew how she had acquired her wealth Heç kəs onun var-dövləti necə əldə etdiyini bilmirdi; Wealth had not brought them happiness Var-dövlət onlara xoşbəxtlik gətirmədi*; **2.** bolluq, çoxluq; **a ~ of illustration** şəkil bolluğu *(jurnalda, kitabda)*; **a ~ of hair** gur saç; ~ **of experience** təcrübə bolluğu / zənginliyi; **3.** *top.* i maddi nemətlər, var-dövlət, xəzinə, yatır; **the ~ of the oceans** okeanların nemətləri; *The country's wealth comes from its oil Ölkənin yatırı/var-dövləti neftdən gəlir*; **4.** *arx.* rifah, xoş güzəran;

◊ **great ~** iri kapitalistlər, varlılar

**wealthy** [ˈwelθɪ] *adj* **1.** zəngin, dövlətli, varlı-karlı, varlı-hallı; **a ~ country** dövlətli/zəngin ölkə; **2.** (**in**) bol, çox, zəngin; ~ **language** zəngin dil; **language ~ in nuances** ifadəli/obrazlı/zəngin çalarları olan dil

**wean** [wi:n] *v* **1.** süddən kəsmək, döşdən ayırmaq *(uşağı)*; anadan ayırmaq *(dana və s.)*; **2.** (**from, of, away from**) tərgitmək; tərgitdirmək *(bir şeydən)*; **to ~ *smb.* from a habit** bir kəsi hər hansı vərdişdən ayırmaq; *How can we wean him away from his bad companions? Onu pis yoldaşlardan necə ayıra bilərik?*

**weanling** [ˈwi:nlɪŋ] *n* təzəcə döşdən ayrılmış uşaq

**weapon** [ˈwepən] *n* **1.** silah; **nuclear/ atomic ~s** nüvə/ atom silahları; **conventional/chemical ~s** adi/kimyəvi silahlar; **~s of mass destruction/ extermination** kütləvi qırğın silahları; *Humour was his only weapon against their hostility Onların düşmənçiliyinə qarşı yumor onun yeganə silahı idi*; **2.** *biol.* özünü müdafiə vasitəsi *(heyvanlarda, həşəratlarda)*

**weaponless** [ˈwepənlɪs] *adj* **1.** silahsız; **2.** *biol.* müdafiəsiz, özünü müdafiə etmək vasitəsi olmayan *(heyvanlar haq.)*

**weaponry** [ˈwepənrɪ] *n hərb.* silah, yaraq, döyüş texnikası

**wear¹** [weəʳ] *n* I **1.** geymə, geyilmə; **a suit for everyday ~** gündəlik geyilən pencək, hər gün geyilən kostyum; *This coat is beginning to look worse for wear Bu pencək artıq geyilməyə yaramır/o çox köhnəlmişdir*; **2.** dəbdə olma; *This is no longer in wear Bu artıq dəbdə deyil; Large hats are now in (general) wear Böyük şlyapalar indi dəbdədir*; **3.** paltar; **a dress for summer ~** yay paltarı; **men's ~** kişi paltarları, kişilər üçün paltar; **working ~** iş paltarı; **beach ~** çimərlik paltarları; çimmək üçün kostyumlar/xalatlar; **4.** köhnəlmə, dağılma, yırtılma; sürtülüb yırtılma; dağıtma, yırtma; *The carpets are showing wear Xalçalar sürtülüb yırtılıb*; **5.** möhkəm olma, davamlı olma *(geyim haq.)*; *There is still much wear in these shoes Bu çəkmələri hələ çox geymək olar, Bu çəkmələr hələ çox möhkəmdir; There is a lot of wear in these tyres Bu şinləri hələ çox işlətmək olar*;

◊ ~ **and tear** işlənib köhnəlmə/xarab olma, aşınma; ~ **and tear of life** həyat çəkişmələri, həyat uğrunda mübarizə

**wear** [weəʳ] *n* II = weir

**wear²** [weəʳ] *v* (*pt* **wore** [wɔ:ʳ], *pp* **worn** [wɔ:n]) **1.** geyinmək, geymək *(bir şeyi)*; *She wore a black gown O, qara paltar geyinmişdi; She wore a hat O, şlyapa geymişdi/qoymuşdu*; **to ~ over-shoes/ stockings** qaloş/corab geymək; *I have nothing to wear Mənim geyməyə heç nəyim yoxdur*; **2.** taxmaq *(eynək, üzük və s.)*; *She wore glasses O, eynək taxmışdı; She wore a flower in her hat O, şlyapasına gül taxmışdı*; **3.** qoymaq *(bığ və s.)*; **4.** saxlamaq *(saç, hörük)*; **to ~ one's hair long/in a braid** saçını uzun/hörükdə saxlamaq; **5.** gəzdirmək; **to ~ a sword /a cane** qılınc/əl ağacı gəzdirmək; **6.** görkəmi/görünüşü olmaq; *She wore an angry frown Onun qaşqabaqlı /acıqlı görkəmi vardı*; **to ~ a troubled look** iztirablı/na-

rahat görkəmi olmaq; **to ~ well** yaşından cavan/gənc görsənmək; *The house wore a neglected look Ev baxımsız görsənirdi*; **7.** geyilmək; dağılmaq, yırtılmaq *(paltar, ayaqqabı və s.)*; *I have worn my socks into holes Mən corablarımı tamam yırtmışam; The carpets are starting to wear Xalçalar sürtülüb yırtılmaq üzrədir*; **to ~ one's shoes into holes** ayaqqabılarını yırtılanacan geymək; **8.** yumaq, yuyub aparmaq, dağıtmaq; sürtmək; *The water has worn a channel Su kanalı yuyub aparıb/dağıdıb*; **9.** davamlı olmaq; *This cloth wears well Bu mahud davamlıdır/möhkəmdir; Good leather will wear for years Yaxşı dəri illərlə geyilir; The material won't wear Bu parça davamlı deyildir/tez yırtılandır*; **10.** yormaq, əldən salmaq, əldən düşmək; **to be worn by anxiety** təlaşdan əldən düşmək; *Despite her age, she had worn well Yaşına baxmayaraq, o, yaxşı qalıb*; **11.** yaxınlaşmaq, başa çatmaq *(vaxt haq.)*; *The day wears towards its close Gün başa/sona çatır*; **12.** *dan.* **to ~ the ensign/the flag** bayraq altında üzmək; **to ~ away** silmək, silinmək; sürtüb/silib aparmaq; *Time has worn away the inscription Zaman kitabəni silib aparıb; The inscription on the coin had worn away Sikkənin üzərindəki yazı silinib/sürtülüb gedib*; **to ~ down 1)** dağılmaq, yırtılmaq; sürtülmək; *The heels of these shoes are worn down Bu ayaqqabıların dabanları yeyilib; The record is worn down Bu plastinka sürtülübdür; The constant rubbing wore down the surface of the stone Daimi sürtülmə daşın səthini yeyib aparıb*; **2)** əldən düşmək, üzülmək; zəifləmək; *Months of illness wore her down Aylarla davam edən xəstəlik onu əldən salıb/üzüb; She was worn down by overwork Hədsiz iş onu üzüb/əldən salıb*; **3)** qırmaq, sındırmaq *(müqavimət və s.)*; **to ~ down the enemy's resistance** düşmənin müqavimətini qırmaq/sındırmaq; *We wore down their opposition after several hours argument Bir neçə saat davam edən mübahisədən sonra biz onların müqavimətini qırdıq/sındırdıq*; **to ~ off 1)** azalmaq, yox olmaq; sürtmək, sürtülmək; *The pain is slowly wearing off Ağrı yavaş-yavaş yox olur/azalır; The dishwasher has worn the glaze off the china Qabyuyan qadın çini qabın minasını sürtüb aparıb; The nap soon wore off Xov tezliklə sürtüldü*; **2)** yumşalmaq, keçmək *(dərd və s.)*; yumşaltmaq, azaltmaq *(dərdi və s.)*; *The effect of the medicine will wear off in a few hours Bir neçə saatdan sonra dərmanın təsiri keçəcək*; **3)** unutmaq, yaddan çıxarmaq; **to ~ off an impression** təəssüratı unutmaq/yaddan çıxartmaq; **to ~ on** tədricən yaxınlaşmaq/başa çatmaq *(vaxt və s. haq.)*; *As the evening wore on, she became more and more nervous Axşam yaxınlaşdıqca, o daha çox əsəbiləşirdi*; **to ~ out 1)** yırtmaq, dağıtmaq; yırtılmaq, dağılmaq; **to ~ out a dress** paltarı dağıtmaq/yırtmaq; *I wore out two pairs of boots on the walking tour Mən piyada səfərdə iki cüt çəkmə dağıtdım; Those thin shoes will wear out quickly O nazik ayaqqabılar tez yırtılacaq*; **2)** tükənmək, tükəndirmək *(səbri və s.)*; hövsələdən çıxartmaq; *His patience wore (was worn) out Onun səbri tükəndi; These children are wearing me out Bu uşaqlar məni hövsələdən çıxarırlar*; **3)** qocaltmaq; *Hardship and penury wore him out before his time Ehtiyac və kasıblıq onu vaxtından əvvəl qocaltdı*; **4)** yormaq, əldən salmaq; *Just listening to his silly chatters wears me out Onun bu səfeh boşboğazlıqlarına qulaq asmaq məni əldən salıb/ yorub*;

◊ **to ~ the breeches/the pants/the trousers** kişixasiyyətli olmaq; evdə hökmranlıq etmək *(qadın haq.)*; kişini/əri ni qapazaltı etmək; *She wears the trousers Bu ailənin başçısı arvaddır*; **to ~ the King's /the Queen's coat** ingilis ordusunda xidmət etmək

**wearable** [ˈweərəbl] *adj* geymək üçün yararlı; geyilməli; *This hat is not wearable Bu şlyapa geyməyə yaramır/geyilməli deyil*; **a wardrobe full of clothes that are no longer ~** köhnə paltarlarla dolu olan paltar şkafı

**wearer** [ˈweərəʳ] *n* yiyə, sahib *(papağın, şlyapanın, paltonun və s.)*; *These shoes will damage the wearer's feet Bu ayaqqabılar sahibinin ayaqlarını döyəcək*

**weariful** [ˈwıərıful] *adj* yorucu, usandırıcı, darıxdırıcı, üzücü

**weariless** [ˈwıərılıs] *adj* yorulmaq bilməyən, yorulmaz; **a ~ man** yorulmaq bilməyən/yorulmaz adam

**wearily** [ˈwıərılı] *adv* **1.** yorucu/usandırıcı/darıxdırıcı tərzdə; **2.** yorulmuş tərzdə, yorğun surətdə/halda/ tərzdə

**weariness** [ˈwıərınıs] *n* **1.** yorğunluq, üzücülük, usandırıcılıq; **2.** sıxıntı, darıxma, üzüntü

**wearing¹** [ˈweərıŋ] *n* **1.** geymə, taxma *(paltar, zinət şeyləri və s.)*; **2.** köhnəlmə, dağılma, yırtılma

**wearing²** [ˈweərıŋ] *adj* **1.** yorucu, üzücü, usandırıcı; **~ journey/occupation** yorucu səyahət /məşğuliyyət; *I've had a wearing day Bu günüm çox yorucu olub; My elderly mother finds shopping very wearing Mənim ahıl anam bazarlıq etməyi çox yorucu/usandırıcı bir şey hesab edir*; **2.** darıxdırıcı, bezikdirici, usandırıcı, zəhlətökən; **~ companion** zəhlətökən/usandırıcı yol yoldaşı

**wearisome** [ˈwıərısm] *adj* **1.** yorucu, üzücü; əldən salan, çox ağır, çətin; **~ day** yorucu gün; **~ task** çətin/ağır tapşırıq; **a ~ child** çətin uşaq; **2.** darıxdırıcı, sıxıntılı, bezikdirici; **~ complaints** bezikdirici şikayətlər

**wearproof** [ˈweəpru:f] *adj* geyməyə davamlı, gec dağılan, möhkəm



**weary¹** [ˈwıərı] *adj* **1.** yorğun, əldən düşmüş; *She was wearied by constant noise Daimi səs-küy onu əldən salmışdı*; **~ in body and mind** fiziki və mənəvi cəhətdən yorulmuş/yorğun; **~ with excitements of the day** gündəlik həyəcanlardan yorulmuş /əldən düşmüş; *I am feeling weary Mən özümü yorğun hiss edirəm*; **2. (of)** səbri tükənmiş; bezikmiş; darıxmaqdan ürəyi sıxılan; *I am weary of life Mən həyatdan bezmişəm*; **3.** yorucu, usandırıcı; darıxdırıcı; **a ~ journey** usandırıcı / yorucu səyahət; **~ hours** yorucu /usandırıcı saatlar

**weary²** [ˈwıərı] *v* **1.** yormaq, əldən salmaq; səbrini tükəndirmək; *She was wearied by constant noise Daimi /Aramsız səs-küy onu yormuşdu/əldən salmışdı*; **2.** yorulmaq, əldən düşmək, səbri tükənmək; bezmək; *She began to weary of her companions O öz tay-tuşlarından (kampaniyasından) bezikməyə başladı; She began to weary of the work O, işdən bezikməyə başladı*; **to ~ for smb./smth.** bir kəs /bir şey üçün darıxmaq

**weasel¹** [ˈwi:zl] *n* **1.** *zool.* sincab *(dələ fəsiləsindən qiymətli xəzi olan heyvan)*; **2.** gəlincik *(dələ fəsiləsindən olan kiçik yırtıcı heyvan)*

◊ **to catch a ~ asleep** bir kəsi yuxuya verib aldatmaq

**weasel²** [ˈwi:zl] *v (həm də* **~ out of)** boyun qaçırmaq *(kələklə)*, azdırmaq, kələk gəlmək, hiylə etmək; **to ~ out of a responsibility** kələk işlədib məsuliyyətdən boyun qaçırmaq

**weather¹** [ˈweðəʳ] *n* **1.** hava; **cold/fine/bad/ sunny/ dull/hot/wet/windy/rainy ~** soyuq /yaxşı/pis/günəşli /tutqun/isti/nəm/ küləkli/yağışlı hava; **~ permitting…** hava yaxşı olsa…; *The weather is very changeable in Baki Bakıda hava çox dəyişkəndir; The success of the crop depends on the weather Məhsulun yaxşı olması havadan asılıdır*; **broken ~** dəyişkən hava; **in all ~(s)** hər cür havada; **rough ~** çox pis/tutqun hava; **2.** fırtına; **to make good ~** *dan.* fırtınaya yaxşı davam gətirmək *(gəmi haq.)*; **under stress of ~** xoşagəlməz/pis hava nəticəsində; fırtına nəticəsində;

◊ **April ~ 1)** dəyişkən hava *(gah günəşli, gah da yağışlı)*; **2)** dəyişkən əhvali-ruhiyyə; **King's/Queen's ~** əla gün; **in the ~** açıq havada, bayırda, küçədə; **to make heavy ~ of smth.** bir şeyi çətinləşdirmək/ mürəkkəbləşdirmək; *He made heavy weather of the simplest tasks O ən sadə tapşırıqları çox mürəkkəbləşdirdi/çətinləşdirdi*; **under the ~ 1)** xəstə, nasaz, üzgün; **to be/to feel/to look under the ~** özünü xəstə/nasaz/üzgün hiss etmək; *She's been a little under the weather recently Son zamanlarda o, bir qədər xəstədir /nasazdır*; **2)** çətin vəziyyətdə, müsibət içərisində; **3)** pulsuz; **4)** *amer.* sərxoş, içmiş; **to have the ~ (of) 1)** *dan.* külək əsən istiqamətə getmək; **2)** üstünlüyə malik olmaq *(bir kəsin qarşısında)*

**weather²** [ˈweðəʳ] *adj* **1.** hava, havaya aid olan; **~ conditions** hava şəraiti; **~ report/message** hava haqqında məlumat; **2.** *dan.* küləkdöyən *(tərəf)*; **~ roll** küləkdöyən tərəfə əyilmə *(gəmi: silkələnmə zamanı)*;

◊ **to keep one's ~ eye open** qulaqlarını şəkləmək, sayıq olmaq

**weather³** [ˈweðəʳ] *v* **1.** davam gətirmək; dözmək *(həm də* **to ~ out/through)** *(küləyə, yağışa, fırtınaya və s.)*; **to ~ a storm** fırtınaya davam gətirmək; **to ~ a financial crisis** maliyyə böhranına davam gətirmək/dözmək; **2.** havaya vermək; havasını dəyişmək; **3.** *geol.* aşınmaq, havanın təsiri ilə dağılmaq

**weather-beaten** [ˈweðə.bi:tən] *adj* **1.** fırtına korlayan/ xarab edən; **2.** codlaşmış, qabalaşmış, cadar-cadar olmuş, qurumuş *(havadan, küləkdən)*; yanmış, qaralmış *(havadan)*; **a ~ face/skin** yanmış/ codlaşmış sifət/dəri; **3.** yıpranmış, didilib tökülmüş, dağılmış; **4.** *məc.* bərkdən-boşdan/sınaqdan çıxmış; bişmiş, möhkəm, bərk, mətanətli *(adam haq.)*

**weather-board** [ˈweðəbɔ:d] *n* *dən.* gəminin küləkdöyən bortu

**weather-bureau** [ˈweðəˈbjuərou] *n* hava bürosu

**weather-chart** [ˈweðəˈtʃa:t] *n* sinoptik/meteoroloji xəritə

**weather-cloth** [ˈweðəklɔθ] *n dən.* qoruyucu brezent *(küləkdən, yağışdan və s.)*

**weather-cock** [ˈweðəkɔk] *n* **1.** yelqovan *(uzun ağacın başına bənd edilmiş və küləyin əsdiyi tərəfə çevrilərək onun istiqamətini göstərən dəmir lövhəcik və ya bayraqcıq)*; **2.** *məc.* hərdəmxəyal / fikrini tez-tez dəyişən adam; səbatsız adam

**weather-deck** [ˈweðədek] *n dən.* yuxarı açıq göyərtə

**weathered** [ˈweðəd] *adj* **1.** atmosfer təsirinə məruz qalmış; tufana/ qasırğaya davam gətirmiş *(gəmi haq.)*; **rocks ~ by wind and water** küləyin və suyun təsirinə məruz qalmış qayalar; **2.** *məc.* bərkdən-boşdan/sınaqdan çıxmış, bişmiş *(adam haq.)*; **3.** *geol.* aşınmış, aşınan *(atmosferin təsiri nəticəsində süxurların dağılması)*; **4.** *tik.* yağış suyu üçün novçası olan *(dam haq.)*

**weather-eye** [ˈweðəraı] *n* **1.** havanın necə olacağını demək bacarığı; **2.** sayıqlıq, ayıqlıq

**weather-forecast** [ˈweðəˈfɔ:ka:st] *n* hava məlumatı/ proqnozu

**weather-glass** [ˈweðəgla:s] *n* barometr

**weather-headed** [ˈweðəˈhedıd] *adj* *arx.* yüngülxasiyyət, dəmdəməki, yelbeyin, yüngül, arsız

**weathering** [ˈweðərıŋ] *n* **1.** yağış suyunun axması üçün maillik/əyinti; **2.** *geol.* aşınma, külək və s. tərəfindən dağılma

**weatherman** [ˈweðəmæn] *n (pl* **-men** [men]) *d.d.* meteoroloq

**weather-map** [ˈweðəmæp] *n* = **weather-chart**

**weather-proof** [ˈweðəpru:f] *adj* havaya davamlı; atmosfer təsirlərinə davamlı olan; **a ~ house** yaxşı qızdırılmış ev; **a ~ window** iki çərçivəli kip bağlanan pəncərə; **a ~ jacket** isti astarlı *(su, külək keçirməyən)* gödəkçə

**weather-prophet** [ˈweðə͵prɔfıt] *n* havanın necə olacağını qabaqcadan xəbər verən *(adam: əlamətlərə və s. görə)*

**weather-service** [ˈweðə͵sə:vıs] *n* hava xidməti

**weather-side** [ˈweðə͵saıd] *n dən.* küləkdöyən tərəf

**weather-sign** [ˈweðəsaın] *n* hava əlaməti/nişanəsi

**weather-stained** [ˈweðə͵steınd] *adj* **1**. rəngi getmiş/solmuş, bozarmış *(havadan)*; **2**. ləkəli, ləkəsi olan *(yağışdan)*

**weather-station** [ˈweðə͵steıʃn] *n* meteoroloji stansiya

**weather-strip** [ˈweðəstrıp] *n* havanı isti saxlamaq üçün qapının, pəncərənin arasına qoyulan keçə *(porolon qat və s.)*

**weather-vane** [ˈweðəveın] *n* = **weathercock** *(1-ci mənada)*

**weatherwear** [ˈweðəweəʳ] *n* qoruyucu paltar *(yağışdan və s.)*; plaş, gödəkçə

**weather-wise** [ˈweðəwaız] *adj* **1**. havanın necə ola biləcəyini əvvəlcədən xəbər verə bilən; **2**. *məc.* ictimai fikrin dəyişə biləcəyini qabaqcadan bilən, küləyin hansı səmtə əsə biləcəyini bilən

**weather-worn** [ˈweðəwɔ:n] *adj* havanın pisləşməsindən əziyyət çəkən

**weave** [wi:v] *v (pt* **wove** [wouv], *pp* **weaved** [wi:vd], **woven** [ˈwouvn]) **1**. *toxuc.* toxumaq; *The women earn their living by weaving Qadınlar yaşayışlarını toxumaqla təmin edirlər*; **2**. hörmək; **to ~ a basket/a web/a wreath** səbət/tor/çələng hörmək; **to ~ primroses into a garland** novruzgülündən çələng hörmək; **3**. *məc.* özündən toxumaq, özündən uydurmaq/quraşdırmaq; **to ~ a romance/a story round a person** bir kəs haqqında bir macəra/ hekayət quraşdırmaq/uydurmaq; **to ~ a plot** sui-qəsd quraşdırmaq/təşkil etmək; **4**. sarmaşmaq, çəlpəşmək, bir-birinə sarılmaq; **5**. vurnuxmaq, gedib-gəlmək; özünə yol açmaq *(kütlə içərisindən)*; **to ~ *one's* way through a crowd** camaat /kütlə içərisindən özünə yol açmaq; **to ~ in and out through the traffic** nəqliyyat arasında manevr etmək; **6**. yavaşca yırğalanmaq, tərpənmək; 7. yelləmək, işarə vermək *(bayraq və s.)*

**weaver** [ˈwi:vəʳ] *n* toxucu

**weazen(ed)** [wi:zn(d)] *adj* = **wizen(ed)**

**web**[1] [web] *n* **1**. tor; **a spider's ~** hörümçək toru; *The spider was spinning Hörümçək tor hörürdü/ qururdu*; **2**. *məc.* quraşdırma, uydurma *(yalan və s.)*; **a ~ of lies** yalan, uydurma, yalan-palan; **a ~ of intrigue** intriqa quraşdırmaq/uydurmaq; **3**. parça; bir top parça; **4**. rulon *(lülə şəklində bükülmüş kağız)*; **5**. *anat.* pərdə *(ördək, yarasa və s. quşların barmaqlarının arasında)*; **6**. tirin nahamar tərəfi; çıxıq; **7**. ox, mil, qol *(relsdə)*; **8**. disk *(təkərdə)*; **9**. tiyə, ağız *(mişarda)*; **10**. arakəsmə

**web**[2] [web] *v* (**-bb-**) **1**. tor hörmək/qurmaq *(hörümçək)*, tor ilə örtmək *(hörümçək)*; **2**. *məc.* tələyə/tora salmaq

**webbed** [webd] *adj* **1**. *zool.* pərdəli, zarlı *(qaz, ördək, qurbağa və s. aid)*; **2**. hörümçək toru ilə örtülmüş; **3**. *anat.* birləşdirici toxuması olan

**webbing** [ˈwebıŋ] *n toxuc.* toxunma lent, tesma, şərid

**webbing moth** [ˈwebıŋmɔθ] *n* ev/mebel güvəsi

**web-toed** [ˈwebˈtoud] *adj* **1**. pərdəli ayaqlar; ayağı pərdəli; **~ goose** ayağı pərdəli qaz; **2**. *tib.* ayaqların bir-birinə birləşməsindən əziyyət çəkən

**wed** [wed] *v (pt, pp* **wedded** [-ıd] *və ya* **wed**) **1**. evlənmək; evləndirmək; ərə vermək; *They were wed in spring Onlar yazda evləndilər*; **2**. nikahlanmaq; nikahlamaq; **to ~ *one's* daughter to a soldier** qızını əsgərə nikahlamaq; *President's daughter is going to wed oil millionaire Prezidentin qızı neft milyonçusuna ərə gedir/nikahlanır*; **3**. birləşdirmək; **to ~ simplicity to/with beauty** sadəliklə gözəlliyi birləşdirmək

**we'd** [wi:d] *d.d.* = **we had; we should, we would**

**wedded** [ˈwedıd] *adj* **1**. ər-arvad; **~ life** ər-arvad həyatı; **~ love** ər-arvad sevgisi/məhəbbəti; **a ~ pair** ər-arvad; **my ~ wife** mənim halal/kəbinli arvadım; **2**. sədaqətli, sadiq, tərəfdar; **~ to his work** (öz) işinə sədaqətli, işini sevən; *He is wedded to his opinion O öz fikrinin üstündə möhkəm durur; He's very much wedded to the idea of free trade O, azad ticarətin tam tərəfdarıdır*

**wedding**[1] [ˈwedıŋ] *n* **1**. toy; nikah, evlənmə, izdivac; nikah mərasimi; *There will be a wedding in the village church on Saturday Şənbə günü kənd kilsəsində toy mərasimi olacaq; We have been invited to their daughter's wedding Bizi onların qızının toyuna dəvət ediblər*; **2**. toyun ildönümü; **wooden ~** taxta toy *(evlənmənin 5 ili)*; **tin ~** qalay toy *(evlənmənin 10 ili)*; **China ~** çini toy *(evlənmənin 20 ili)*; **silver ~** gümüş toy *(evlənmənin 25 ili)*; **gold ~** qızıl toy *(evlənmənin 50 ili)*; **diamond ~** brilyant toy *(evlənmənin 60-75 ili)*

**wedding**[2] [ˈwedıŋ] *adj* toy; **a ~ dress/invitation/present/ceremony** toy paltarı/dəvətnaməsi/hədiyyəsi/ mərasimi; **members of the ~** toy qonaqları; **~ announcement** toy elanı; **~ journey** toy səyahəti

**wedding-breakfast** [ˈwedıŋ͵brekfəst] *n* nikah mərasimindən sonra qonaqların qəbul edilməsi *(günün istənilən vaxtında)*

**wedding-cake** [ˈwedıŋkeık] *n* toy tortu



**wedding-day** [ˈwedıŋdeı] *n* toy günü; toyun ildönümü; **their fifth ~** onların toylarının beşinci ildönümü

**wedding-dress** [ˈwedıŋdres] *n* nikah/toy paltarı

**wedding-favour** [ˈwedıŋ͵feıvəʳ] *n* sağdış-soldışın bağladığı bant

**wedding-ring** [ˈwedıŋrıŋ] *n* nişan üzüyü

**wedge**[1] [wedʒ] *n* **1**. paz, çiv; **to force/to drive a ~** paz çalmaq/çaxmaq; **2**. paz formalı/pazaoxşar/pazvarı şey; **a ~ of cake/of cheese** üçbucaq şəklində tort/pendir parçası;

◊ **the thin end of the ~** ≅ ilk addım *(bir şeyə)*; təvazökar, lakin çox ümidverici addım

**wedge**[2] [wedʒ] *v* **1**. pazla möhkəmlətmək *(həm də* **to ~ in/on/up**); *The window doesn't stay closed unless you wedge it Pəncərəni pazla möhkəmlətməsən/ möhkəmlətməsəniz, bağlanmayacaq*; **2**. pazın/çivin köməyilə yarmaq/parçalamaq; **3**. sıxışdırmaq, itələmək; *I was so tightly wedged between two other passengers that I couldn't get off the bus İki digər sərnişin arasında elə sıxışdırılmışdım ki, mən avtobusdan düşə bilmədim;* **4**. əl ilə gili övkələmək/övkələyib yumşaltmaq *(dulusçuluqda)*; **to ~ in** soxmaq, paz vurmaq; **to ~ oneself in** özünü soxmaq, soxulmaq; qarışmaq *(söhbətə və s.)*; **to ~ off** itələyib aralamaq, itələyib yol açmaq; düşmək

**wedge-key** [ˈwedʒˈki:] *n* şpon çivi, dilçək; çiv, mil

**wedge writing** [ˈwedʒˈraıtıŋ] *n dilç.* mixi xətt, mixi yazı

**wedgies** [ˈwedʒız] *n pl* tanketka *(yarımaçıq yüngül qadın tuflisi)*

**wedlock** [ˈwedlɔk] *n* **1**. ər-arvadlıq; **2**. nikah; **children born in ~** nikahla doğulan uşaqlar; **children born out of ~** nikahsız / qeyri-qanuni doğulan uşaqlar

**Wednesday** [ˈwenzdı] *n* çərşənbə

**wee**[1] [wi:] *n* sidik *(həm də* **~wee**); *Do a wee-wee Pi-pi elə, işə (balaca uşaqlara deyilir)*

**wee**[2] [wi:] *v* işəmək, siymək

**weed**[1] [wi:d] *n* I **1**. alaq otu, alaq; *My garden is running to weeds Mənim bağımı alaq otları basıb; She spent the whole day pulling up weeds in the flowerbeds O bütün günü gül ləklərinin alaq otunu təmizləməklə məşğul oldu*; **2**. (**the ~**) **1**) tütün; **2**) *d.d.* siqar; **to drag the ~** tütün /siqar çəkmək, qullab vurmaq; **3**. *amer. sl.* marixuana; **4**. **1**) arıq/ uzundraz oğlan; **2**) *d.d.* yabı *(at haq.)*;

◊ *Ill weeds grow apace at. söz. Pis toxumdan az məhsul alınar,* ≅ *Ot kökü üstə bitər*

**weed** [wi:d] *n* II **1**. *pl* dul qadının matəmi *(adət.* **widow's ~s**); **2**. matəm lenti /sarğısı

**weed**[2] [wi:d] *v* **1**. alaq etmək/vurmaq; alaq otundan təmizləmək; *I have been busy weeding (in) the garden Mən bağın alaq otlarını təmizləməklə məşğul olmuşam*; **2**. təmizləmək; seçmək; **to ~ out the weakest plants** zəif bitkiləri təmizləmək; **to ~ a library** kitabxananı təmizləmək *(lüzumsuz kitablardan)*; **to ~ away/out** kənar etmək, təmizləmək; seçmək; **to ~ out the herd** sürüdən xırda heyvanları seçib ayırmaq; **to ~ out errors** səhvləri tutmaq; **to ~ out useless books from a library** lazımsız kitabları kitabxanadan çıxartmaq

**weedy** [ˈwi:dı] *adj* **1**. alaqlı, alaq otu basmış; **2**. alaq otu kimi artan /böyüyən; **3**. zəif, sısqa, cılız; yöndəmsiz, biçimsiz; **a ~ young man** arıq sısqa gənc adam

**week** [wi:k] *n* **1**. həftə; **this/last/next ~** bu/keçən/gələn həftə; **in a ~** bir həftədən sonra; **a six ~s' holiday** altıhəftəlik məzuniyyət; **three times a ~** həftədə üç dəfə; **~ by ~** həftəbəhəftə, hər həftə; *What day of the week is it today? Bu gün həftənin hansı günüdür? I'll be away for no more than a week Mənim burada olmamağım bir həftədən çox çəkməyəcək*; **2**. həftənin altı iş günü; *He spends the week in town but is at home on Sundays O, bazar ertəsindən şənbə gününə qədər (bir həftə) şəhərdə, bazar günü isə evdə olur; He works a 40-hour week O, həftədə 40 saat işləyir; How many lessons are there in the school week? Həftədə məktəbdə neçə saat dərs olur?*

◊ **a ~ of Sundays** *d.d.* **1**) yeddi həftə; **2**) ≅ ömürlük, əbədilik; **~ in, ~ out** aramsız, fasiləsiz

**week-day** [ˈwi:kdeı] *n* iş günü, adi günlər, həftənin günləri

**week-end**[1] [ˈwi:kend] *n* uikend, həftə sonu *(şənbə və bazar)*; **to go to the country for the ~** həftə sonunda kəndə getmək; **to spend the ~ at home** həftə sonunu evdə keçirmək

**week-end**[2] [ˈwi:kend] *v* həftə sonu istirahət etmək; **to ~ at Brighton** Braytonda həftə sonu keçirmək

**week-ender** [ˈwi:kˈendəʳ] *n* **1**. həftə sonu istirahət etməyə gedən adam; *We have many weekenders here Burada həftə sonu istirahətə gələn çoxlu adam olur*; **2**. kiçik çamadan

**weekly**[1] [ˈwi:klı] *n* həftəlik, həftədə bir dəfə çıxan *(qəzet, jurnal və s.)*

**weekly**[2] [ˈwi:klı] *adj* bir həftə müddətində olan; həftədəbir/hər həftə olan; **a ~ visit/magazine** bir həftəlik səfər/jurnal *(həftədə bir dəfə çıxan jurnal)*

**weekly**[3] [ˈwi:klı] *adv* hər həftə, həftədə bir dəfə; *Are you paid weekly or monthly? Sənə/Sizə hər həftə, yaxud ayda bir dəfə əməkhaqqı verirlər? The machine must be checked weekly Maşın həftədə bir (dəfə) yoxlanılmalıdır*

**week-old** [ˈwi:kˈould] *adj* həftəlik; **a ~ child** bir həftəlik uşaq; **~ news** ötən həftə alınan xəbərlər

**ween** [ˈwi:n] *v arx.* **1**. düşünmək, güman etmək; hesab etmək; *I ween Mən belə hesab edirəm*; **2**. ümid /güman etmək; **3**. xəyal etmək, xülyaya qapılmaq

**weep**[1] [wi:p] *n* hönkürtü ilə/hönkür-hönkür ağlama; ağlama səsi; **to have a good ~** hönkür-

hönkür ağlamaq, ağlayıb ürəyini boşaltmaq; *After the children left home I had a little weep Uşaqlar çıxıb gedəndən sonra mən bir az ağlayıb ürəyimi boşaltdım*

**weep²** [wi:p] *v (pt, pp* **wept**) **1.** ağlamaq, göz yaşı tökmək, hönkür-hönkür ağlamaq; *She wept bitter tears over her lost youth O, itirilmiş gəncliyi üçün acı göz yaşı tökdü; My heart weeps for you Səndən /Sizdən ötrü ürəyim qan ağlayır;* **to ~ for joy/with pain** sevincdən /ağrıdan hönkür-hönkür ağlamaq; **to ~ one's fill** ağlayıb ürəyini boşaltmaq; **2.** tərləmək; rütubət/nəm vermək; *The pipes have wept Borular nəm verib/tərləyib; Cold pipes weep in hot weather İsti havada soyuq borular tərləyir; The wound is weeping Yaradan qan sızır;* **3.** (**over, for**) ağlamaq, yasını tutmaq; *A mother wept over her dead child Ana öz ölmüş uşağına görə ağlayırdı;* **to ~ one's sad fate** (öz) qara taleyi üçün ağlamaq; **to ~ for one's sins** (öz) günahları üçün ağlamaq; **to ~ away** ağlamaq, ağlayıb ürəyini boşaltmaq; **to ~ down** axşama qədər/günəş qürub edənə qədər ağlamaq; **to ~ out** doyunca ağlamaq, ağlayıb ürəyini boşaltmaq, ağlayıb sakit olmaq/sakitləşmək

**weeper** ['wi:pə^r] *n* **1.** ağlayan, ağlağan; **2.** ağıçı, ağı deyən adam; həmişə ağlayıb-zarıyan adam; **3.** matəm sarğısı; **4.** *pl d.d.* bakenbard *(çənənin altı qırxılaraq, yanaqlarda saxlanılan saqqal)*

**weeping¹** ['wi:pɪŋ] *n* **1.** ağlama, göz yaşları; zarzar ağlama, hönkürtü; hönkür-hönkür ağlama; **2.** damcılarla örtülmə, tərləmə; **3.** suyun sızıb keçməsi, su sızması *(pəncərədən və s.)*

**weeping²** ['wi:pɪŋ] *adj* **1.** ağlayan, göz yaşı axıdan/tökən; **2.** ağlağan; **3.** *bot.* salxım; **~ willow** salxım söyüd; **4.** tərləyən, tər tökən, damcılarla örtülən; **~ glass/windows** tərləyən şüşələr/pəncərələr; **5.** *tib.* sulanan, sudurlu; nəm, rütubətli; **~ eczema** sulanan ekzema, sudurlu ekzema; **~ wound** qan sızan/sulu yara;

◊ **~ cross** *tar.* tövbə edənlərin ibadət etdikləri xaç; **to come home by ~ cross** peşman olmaq, tövbə etmək

**weepy¹** ['wi:pɪ] *n d.d.* **1.** sentimental əsər; **2.** insan qəlbini riqqətə gətirən kitab / film / pyes və s.

**weepy²** ['wi:pɪ] *adj* ağlağan; göz yaşı tökən; riqqətə gətirən; **a ~ child** ağlağan uşaq; **a ~ ending** riqqətə gətirən/ağladan sonluq; *She is still feeling weepy O hələ də göz yaşı tökmək istəyir*

**weevil** ['wi:vɪl] *n k.t. zool.* taxılbiti

**weevilled** ['wi:vɪld] *adj* taxılbiti basmış, taxılbitli *(taxıl haq.)*

**weft** [weft] *n* **1.** *toxuc.* arqac; **2.** *d.d.* parça, qumaş

**weigh** [weɪ] *v* **1.** çəkmək; çəkilmək; *He weighed himself on the scales O özünü tərəzidə çəkdi; He weighed the stone O, daşı çəkdi; The load must be weighed before it is put in the washing machine Paltaryuyan maşına salınmamışdan əvvəl yük çəkilməlidir;* **2.** çəkisi olmaq; *How much do you weigh? Sənin/Sizin çəkin/çəkiniz nə qədərdir?; It weighs five kilogrammes Bu, beş kilo gəlir; She weighs 60 kilos O, 60 kilodur;* **3.** ölçüb-biçmək, götür-qoy etmək; qiymətləndirmək; **to ~ the advantages and disadvantages** xeyir və ziyanı ölçüb-biçmək; **to ~ one's words** sözlərini ölçüb-biçmək; sözlərinə fikir vermək; **4.** (**with, against**) müqayisə etmək; ölçmək; **to ~ an argument with/against another** bir mülahizəni başqası ilə tutuşdurmaq/müqayisə etmək və ona qiymət vermək; **to ~ the pros and cons** lehinə və əleyhinə olan şeyləri tutuşdurmaq; **5.** (**with**) çəkisi/təsiri/ əhəmiyyəti/hörməti/etibarı/nüfuzu olmaq; *His word weighs heavily with me Onun sözlərinin mənə böyük təsiri vardır; Mən onun sözlərinə/ fikrinə çox əhəmiyyət verirəm; His evidence did not weigh much with the judge Onun dəlilləri hakimə çox da təsir etmədi, Hakim onun dəlillərinə heç də böyük əhəmiyyət vermədi;* **to ~ down 1)** ağırlıq etmək; əyilmək; əymək, artıq/ağır gəlmək *(çəkidə); The branches were weighed down with ripe apples Yetişmiş almalardan ağacın budaqları əyilmişdi; The man was weighed down by all the luggage Yükün ağırlığından kişi əyilmişdi/ikiqat olmuşdu;* **to ~ down the scales** tərəzinin gözünü əymək; **2)** *məc.* üzmək, sıxmaq, kədərləndirmək; *He weighed down with grief /with debts O, dərddən-qəmdən/borcdan üzüldü;* **to ~ in 1)** özünü çəkdirmək, tərəzidə çəkilmək *(yarışdan əvvəl: boksçu və s. haq.); He weighed in at several pounds below the limit O çəkildi və çəkisi qoyulan həddən bir neçə funt əskik oldu; The champion weighed in just 65 kilos Çempionun çəkisi düz 65 kilo oldu/gəldi;* **2)** (**with**) *d.d.* irəli sürmək, əlavə etmək; möhkəmlətmək; **to ~ in with an argument** dəlillə möhkəmlətmək; inandırıcı/həlledici dəlil sürmək, dəlillə əsaslandırmaq; **to ~ on** təsir / təzyiq etmək; sıxmaq; təlaş doğurmaq; *The responsibilities weigh heavily on him Məsuliyyət hissi onu çox möhkəm sıxır/onda çox təlaş doğurur; It was obvious that something was weighing on her mind Açıq-aşkar aydın idi ki, nə isə onun beynində dolaşırdı/ nə isə ona rahatlıq vermirdi;* **to ~ out 1)** çəkmək, çəkib vermək *(tərəzidə); Weigh out a kilo of tomatoes Bir kilo pomidor çək/çəkin;* **to ~ out two kilos of butter** iki kilo yağ çəkib vermək; **2)** *id.* yarışdan sonra çəkilmək *(boksçu və s. haq.);* **to ~ up 1)** tarazlaşdırmaq, bərabərləşdirmək, müvazinət yaratmaq; **2)** qaldırmaq *(linglə və s.);* **3)** götür-qoy etmək, bir qərara gəlmək; qiymətləndirmək; *For most of the interview he sat in silence, weighing-up Bütün müsahibə zamanı o götür-qoy edərək sakitcə oturmuşdu;* **to ~ upon** üzmək, sıxmaq; təsir etmək; *The matter weighed upon his conscience Bu məsələ ağır bir yük kimi onun vicdanını əzirdi/sıxırdı/ incidirdi; These troubles weigh upon/on his mind Bu əzab-əziyyətlər onu bərk mütəəssir edir*



**weigh-bridge** ['weɪbrɪdʒ] *n* qapan, tərəzi

**weighed** [weɪd] *adj* **1.** çəkilmiş; **~ and wrapped meat** çəkilmiş və bükülmüş/qablaşdırılmış ət; **2.** əzilmiş, yüklənmiş, beli bükülmüş; **~ down by grief** dərddən/qəmdən beli bükülmüş; **~ down with cares** qayğılarla yüklənmiş

**weigher** [weɪə^r] *n* **1.** tərəziçi, qapançı; **2.** tərəzi, yaylı əl tərəzisi

**weighing** ['weɪɪŋ] *n* tərəzidə çəkmə

**weighing-machine** ['weɪɪŋmə'ʃi:n] *n* tərəzi, avtomat qapan

**weigh-scale** ['weɪskeɪl] *n* **1.** tərəzinin gözləri; **2.** *pl* tərəzi

**weight¹** [weɪt] *n* **1.** çəki; kütlə; *Bananas are usually sold by weight Banan adətən çəki ilə satılır; It's nearly 10 kilos in weight Onun çəkisi təxminən 10 kilodur;* **atomic ~** atom çəkisi; **molecular ~** molekulyar çəki; *She is twice my weight Onun çəkisi iki dəfə məndən artıqdır;* **to put on ~** kökəlmək, çəkisi artmaq; *He has put on weight since he gave up smoking Papirosu atandan bəri o kökəlib;* **to lose/to take off ~** arıqlamaq, çəkisini itirmək; *You must eat less if you want to lose weight Əgər arıqlamaq istəyirsənsə / istəyirsinizsə az yeməlisən/yeməlisiniz;* **2.** ağırlıq; yük; *Lead is often used because of its weight Qurğuşun çox zaman ağırlığına görə işlədilir; The weight of the overcoat made it uncomfortable to wear Paltonun ağırlığı onu geyməyə narahatlıq yaradırdı;* **under its own ~** öz ağırlığı altında; *He must not lift weights Ona ağırlıq/yük qaldırmaq olmaz;* **~ of roof** damın ağırlığı; **dead ~** *tex.* xüsusi çəki; **3.** *məc.* yük, ağır yük *(qayğı, iş və s.);* **to feel the ~ of smth.** bir şeyin ağır yükünü hiss etmək; *That's a great weight off my mind Çiynimdən dağ götürüldü, Ürəyimə elə bil su çiləndi;* **4.** nüfuz, hörmət, etibar; **men of ~** nüfuzlu/hörmətli adamlar; *His word carries great weight with us Onun sözü ilə biz çox hesablaşırıq;* **an argument of great ~** əsaslı/etibarlı dəlil; **5.** *hərb.* güc, zərbə; **to throw the main ~ (into)** əsas zərbəni yönəltmək *(kiməsə, nəyəsə);* **6.** tərəzi/çəki daşı; *pl* xırda çəki daşları; **a pound ~** bir funtluq çəki daşı; **7.** *id.* ştanq; **~ lifting** ağırlıq/ştanq qaldırma; **8.** əhəmiyyət vermə; mühüm olma; *I don't attach any weight to these rumours Mən bu şayiələrə heç bir əhəmiyyət vermirəm; Don't worry what he thinks, his opinion doesn't carry much weight Onun nə danışmasına məhəl qoyma/ qoymayın, onun fikri heç bir əhəmiyyət kəsb etmir;* **to give ~ to** əhəmiyyət vermək; **to lay ~ on** qiymətləndirmək, əhəmiyyət vermək;

◊ **to be worth one's ~ of/in gold** qızıl qiymətinə olmaq; çox qiymətli /əvəzedilməz olmaq; *Our maid is worth her weight in gold Bizim xidmətçimiz qızıl adamdır; Doşab almışıq, bal çıxıb (xidmətçi haq.);* **to pull one's ~ 1)** yaxşı avar çəkmək; **2)** öz işini vicdanla yerinə yetirmək, öz yükünü özü çəkmək; *My assistant hasn't been pulling her weight recently Mənim assistentim son zamanlar öz işini vicdanla yerinə yetirmir;* **to throw one's ~ about** özünü açıq-saçıq aparmaq; heç şeydən çəkinməmək; lovğalanmaq

**weight²** [weɪt] *v* **1.** yükləmək, çəkisini artırmaq; daşla çəkmək, çəki daşı asmaq; **to ~ a stick with lead** ağacı qurğuşunla ağırlaşdırmaq *(silah vəziyyətinə salmaq üçün);* **2.** (**with**) yük olmaq, zəhmətə/ çətinliyə salmaq; **3.** qatmaq, əlavə etmək, qarışdırmaq *(çəkisinin ağır gəlməsi üçün);* **to ~ sugar** qəndi nəmləndirmək/nəm etmək; **4.** güc/qüvvət vermək; **5.** çəkmək, çəkisini müəyyən etmək; **to ~ down 1)** aşağı çəkmək/dartmaq, dartıb aparmaq; **2)** zəhmətə salmaq, sıxıntı/zəhmət vermək *(öz qayğısını və s. başqasının çiyninə atmaqla)*

**weightless** ['weɪtlɪs] *adj* çəkisiz

**weightlessness** ['weɪtlɪsnɪs] *n* çəkisizlik, çəkisizlik şəraiti/vəziyyəti; **to become accustomed to ~ in a spacecraft** hava gəmisində çəkisizliyə alışmaq

**weight-lifter** ['weɪt.lɪftə^r] *n id.* idman daşı qaldıran, ağırlıq/ştanq qaldıran; ştanqçı

**weight-lifting** ['weɪt.lɪftɪŋ] *n id.* ağırlıq qaldırma; ağır atletika

**weighty** ['weɪtɪ] *adj* **1.** tutarlı, əsaslı, mötəbər, ciddi, mühüm; **~ reason /argument/decision** əsaslı/tutarlı səbəb/dəlil/qərar; **~ matters of state** dövlət əhəmiyyətli işlər; **~ opinions** ciddi/mühüm/ mötəbər nöqteyi-nəzərlər/mülahizələr; **2.** ağır; **~ steps/ burden** ağır addımlar/yük; **3.** zəhmətli, məşəqqətli, yorucu; **~ cares/problems** məşəqqətli qayğılar/ problemlər

**weir¹** [wɪə^r] *n* bənd, dəhnə

**weir²** [wɪə^r] *v* bənd çəkmək, qabağını bağlamaq *(suyun)*

**weird** [wɪəd] *adj* **1.** nəhs, pis, faciəli, fəlakətli, məşum, bədbəxt; *Weird shrieks were heard in the darkness Qaranlıqda dəhşətli/məşum çığırtılar eşidildi;* **2.** gizli, sirli, xariqüladə, qeyri-təbii; **3.** əcaib, qəribə, fantastik; *What a weird idea! Necə də qəribə fikirdir! What weird hats women wear nowadays! İndi qadınlar necə də əcaib şlyapalar geyirlər!* **a garden full of ~ and wonderful plants** qəribə və gözəl bitkilərlə dolu bağ;

◊ **the Weird Sisters** *əs.* **1)** əcinnə; küpəgirən cadugər qarı; **2)** *arx.* tale ilahəsi

**weirdie** ['wɪədɪ] *n d.d.* qəribə/əcaib/tühaf adam

**weirdy** ['wɪədɪ] *n amer.* = **weirdie**

**welcome¹** ['welkəm] *n* **1.** qəbul, qonaqpərvərlik, qonaqpərəstlik, qonaqcılıq; **a hearty/a cold ~** səmimi/soyuq qəbul; **to give a warm ~** səmimi ürəkdən qəbul etmək, qonaqpərvərlik göstərmək; **to find a ready ~** çox gözəl qəbul olunmaq; **to wear out/to outstay/to overstay one's ~** bir kəsin qonaqpərvərliyindən sui-istifadə et-

mək; *We were touched by the warmth of their welcome Biz onların səmimi qonaqpərvərlik göstərmələrindən mütəəssir olduq*; 2. salamlama; **to bid ~** salamlamaq *(qonaqları)*

**welcome²** ['welkəm] *adj* 1. arzuolunan, çoxdan gözlənilən; ~ **news** çoxdan gözlənilən xəbər; ~ **guest** arzuolunan qonaq; ~ **letter** çoxdan gözlənilən məktub; *We've been made most welcome in the village Kənddə bizi çox böyük qonaqpərvərliklə qarşıladılar*; **to make a person ~** bir kəsi mehribanlıqla /gülərüzlə/səmimiyyətlə qarşılamaq; 2. bir şeydən istifadə etməyə hüququ/icazəsi olan; həvəslə/ məmnuniyyətlə icazə verilən; *He is welcome to use my library Mən məmnuniyyətlə ona kitabxanamdan istifadə etməyə icazə verirəm; You are welcome to use my car Mənim maşınım sənin/sizin ixtiyarındadır/ ixtiyarınızdadır; You are welcome to your opinion Öz fikrində/ fikrinizdə qala bilərsən/bilərsiniz*;

◊ *(You are) welcome!* 1) *Xoş gəlmişsən/ gəlmişsiniz!* 2) *Dəyməz (təşəkkürə cavab olaraq); Thank you for the lift – You're welcome Məni maşına götürdüyünə/götürdüyünüzə görə təşəkkür edirəm – Dəyməz*

**welcome³** ['welkəm] *v* 1. salamlamaq, xoşgəldin demək/etmək; gülərüzlə/səmimiyyətlə qarşılamaq *(qonağı)*; *I welcome you to my house Bizə xoş gəlmişsən/xoş gəlmişsiniz*; **to ~ a friend home** dostu evə qayıtmağı münasibəti ilə təbrik etmək; *They were there at the door to welcome us Onlar bizi salamlamaq/bizə xoşgəldin demək üçün qapının ağzında idilər; She welcomed the delegates to the conference O, konfransa gələn nümayəndələri salamladı*; 2. alqışlamaq, bəyənmək; **to ~ a plan/an idea/criticism** planı/ fikri /tənqidi bəyənmək; *Harry doesn't welcome intrusions into his privacy Harri onun məxfi işlərinə qarışmağı bəyənmir*

**welcome⁴** ['welkəm] *int. Xoş gəlmişsən/gəlmişsiniz! (həm də You are welcome! Welcome home! Həmişə evində-eşiyində/evinizdə-eşiyinizdə!)*

**weld¹** [weld] *n tex.* qaynaq yeri, qaynaq olunmuş yer

**weld²** [weld] *v tex.* qaynaq etmək; qaynaqla birləşdirmək; *Weld parts together Hissələri qaynaqla birləşdir/birləşdirin! The car has had a new wing welded on Maşına təzə bir qanad qaynaq edilib*

**welder** ['weldəʳ] *n* 1. qaynaqçı, qaynaq ustası; 2. *xüs.* qaynaq aqreqatı

**welding** ['weldıŋ] *n tex.* qaynaq

**welfare¹** ['welfeəʳ] *n* 1. rifah, xoş güzəran, firavanlıq; dinclik, salamatlıq; **the ~ of the nation** millətin güzəranı/rifahı; *The parents are responsible for the welfare of their children Valideynlər uşaqlarının güzəranı/firavanlığı üçün məsuliyyət daşıyırlar*; **for the ~ of the people** xalqın xoş güzəranı /rifahı üçün; 2. xeyriyyəçilik; ~ **work** məişət şəraitini yaxşılaşdırmaq üçün görülən tədbirlər *(yoxsullar, tələbələr və s. haq.)*; **student ~** tələbə xeyriyyəçiliyi

**welfare²** ['welfeəʳ] *adj* xeyriyyəçilik, xeyriyyə; **a child ~ clinic** uşaq-xeyriyyə klinikası; **The government's Social Welfare Department** Dövlət ictimai təminat şöbəsi

**welkin** ['welkın] *n şair.* səma, göy, göy qübbəsi

**well¹** [wel] *n* I 1. quyu; nohur; **to dig/to drill/to sink a ~** quyu qazmaq; *The villagers get their water from a well Kənd adamları suyu quyudan götürürlər/ çıxardırlar*; 2. neft quyusu; **the oil ~s of Baki** Bakının neft quyuları; 3. bulaq, çeşmə; qaynaq *(mineral)*; 4. pilləkən arakəsməsi; 5. lift şaxtası; 6. vəkillərin oturduğu yer *(ingilis məhkəməsində)*; 7. duruldücu hovuz/çən;

◊ **a ~ of life** həyat çeşməsi; **a ~ of knowledge** bilik dəryası; *He is a well of information O, bilik dəryasıdır*

**well** [wel] *n* II 1. xeyir, yaxşılıq; *I wish him well Mən onun yaxşılığını istəyirəm*; 2. **(the ~)** *top.* i sağlam adamlar; *The sick are often impatient with the well Xəstə adamlar çox zaman sağlam adamlara qarşı səbirsizlik göstərirlər*

**well²** [wel] *adj* **(better** [betəʳ]; **best** [best]**)** 1. yaxşı, sağlam, saz; *Is she well or ill? O, yaxşıdır, yoxsa xəstə?* ~ **babies** sağlam körpələr; *He's not a well man O, sağlam adam deyildir*; ~ **baby ward** təzə doğulan sağlam körpələr palatası; *I am quite well Mən tamam sağlamam*; 2. yaxşı, qaydasında olan; *All is well Hər şey qaydasındadır/yaxşıdır; It seems that all is not well at home Elə görünür ki, evdə heç də hər şey yaxşı deyildir; All turned out well Hər şey yaxşı qurtardı*; **to be ~ out of *smth*.** bir şeydən yaxşı yaxa qurtarmaq; *It would be well to inquire Məlumat toplamaq yaxşı olardı*; 3.: ~ **up** bilən, fərasətli; *He isn't well up in psychology O, psixologiya sahəsində qüvvətli deyildir*

**well³** [wel] *v* 1. **(to ~ up/out/forth)** fontan vurmaq, fışqırmaq; *Blood welled (out) from the cut Kəsikdən qan fontan vurdu/fışqırdı*; 2. qalxmaq, dolmaq *(su, göz yaşı və s. haq.)*; *Tears welled up in her eyes Onun gözləri yaşla doldu*

**well⁴** [wel] *adv* **(better; best)** 1. yaxşı; əla; qiyamət; müvəffəqiyyətlə; **to work/to sing/to swim** ~ yaxşı işləmək/mahnı oxumaq/üzmək; *I did not sleep well last night Dünən gecə mən yaxşı yatmadım; Well done! Əla! Qiyamət! The conference was very well organized Konfrans çox gözəl / əla təşkil olunmuşdu; I hope everything is going well with you Ümid edirəm ki, işlərin/işləriniz yaxşı gedir; She is well spoken of Onun əla hörməti/nüfuzu var; Do these colours go well together? Bu rənglər bir-birini yaxşı tuturmu?*; **to be doing** ~ yaxşılaşmaq, özünü getdikcə yaxşı hiss etmək *(xəstə haq.)*; **to be ~ out of *smth*.** bir şeydən canını/yaxasını qurtarmaq; *I wish I was well out of*



*it Mən istərdim ki, bundan yaxamı qurtaraydım*; 2. yaxşıca; əsaslı; necə ki lazımdır; doyunca; diqqətlə; *We ought to examine the results well Nəticələri gərək yaxşıca/diqqətlə yoxlayaq*; **to talk ~** ürəyi istədiyi qədər/doyunca danışmaq; *Shake well before using İstifadə etmədən əvvəl yaxşıca/yaxşı-yaxşı silkələ/ silkələyin (dərmanı); The surface must be well prepared before you start to paint Rəngləməyə başlamamışdan əvvəl səth yaxşıca hazırlanmalıdır; They treated me very well Onlar mənimlə çox yaxşı rəftar etdilər*; 3. yaxşı, ləyaqətli; ağıllı, düzgün; **to behave ~** özünü yaxşı/ləyaqətlə aparmaq; *You can't well refuse to help him Sənin/Sizin ona kömək etməkdən imtina etməyə heç bir haqqın/haqqınız yoxdur; I cannot well manage it Mən onun öhdəsindən yaxşı gələ bilmərəm*; 4. tamamilə, tam, tamam; *He was well out of sight O tamamilə görünməz oldu*; **to be ~ pleased** tamam məmnun olmaq, tamamilə razı qalmaq; *It may well be true Tamamilə mümkündür, Elə bu belədir; You may well be surprised Sənin/ Sizin təəccüblənməyə tam əsasın/əsasınız vardır; You are well able to settle this affair Sənin/Sizin bu məsələni tam yoluna qoymağa /nizama salmağa bacarığın/bacarığınız vardır*; 5. xeyli, kifayət qədər, çox; *The work is well on İş xeyli irəli gedib; He is well past forty Onun yaşı qırxdan xeyli keçib*; **to love *smb.* ~** bir kəsi çox sevmək; ~ **on in life** gəncliyi xeyli keçmiş, yaşlı; ~ **back** xeyli geri; ~ **forward/ahead** xeyli irəli; *I am well forward with my work Mən işimdə xeyli qabaqdayam/irəli getmişəm*; ~ **into the afternoon/into the night** günortadan/gecədən xeyli keçmiş; *It may well be true Çox güman ki/Əslində belədir; She was driving as well over the speed limit O, maşını sürət limitindən xeyli artıq sürürdü*;

◊ **as ~** 1) əlavə, əlavə olaraq, həm də; *He gave me money and clothes as well O mənə pul, həm də paltar verdi; Are they coming as well? Onlar da gəlirlərmi?*; 2) eyni ilə, eyni müvəffəqiyyətlə; *You may as well begin at once Sən/Siz eyni ilə dərhal başlaya bilərsən/bilərsiniz; You might as well throw your money Sən/Siz eyni olaraq pulunu/ pulunuzu göyə sovura bilərdin/bilərdiniz*; **as ~ as...** ...kimi, eyni zamanda, ...həmçinin, ...dəxi, ... də, ...habelə; *Does he speak English as well as you do? O da ingiliscə sənin/sizin kimi yaxşı danışırmı? He grows flowers as well as vegetables O, gül, həm də tərəvəz yetişdirir*; ~ **and truly** əsaslı, tamamilə; ~ **enough** kifayət qədər yaxşı, çox yaxşı; *This girl speaks French well enough as our interpreter Bu qız bizim dilmancımız kimi fransızca çox gözəl danışır*; ~ **away** irəli getmə, yaxşı tərəqqi etmə; *By the end of the month, we'll be well away Ayın axırına kimi, işlərimiz yaxşı olacaq/irəli gedəcək*; ~ **off** yaxşı vəziyyətdə olma *(xüs. maliyyə cəhətdən)*; *His family is not very well off Onun ailəsinin vəziyyəti maddi cəhətdən yaxşı deyildir; Some people don't know when they're well off Bəzi adamlar öz xoşbəxtliklərini anlamırlar/başa düşmürlər*; ~ **off for *smth*.** bir şeydən çox olmaq; *We're well off for storage space in the new flat Yeni mənzilimizdə şey saxlamaq üçün boş yerimiz çoxdur; All's well that ends well at. söz. ≅ Sonu yaxşılıqla bitən hər şey yaxşıdır; Well begun is half done at. söz. ≅ Yaxşı başlanğıc işin yarısı deməkdir*

**well⁵** [wel] *int* Hə!, Yaxşı!, Di, Yox canım?, Yox aa!, Doğrudanmı? Onda *(təəccüb, güzəşt, razılıq və s. bildirir)*; *Well good! Yaxşı! Hə! If you promise that, well and good Əgər sən/siz onu vəd edirsənsə/edirsinizsə, onda yaxşı; Well, to be sure! Bir buna bax!; Well, what next? Hə, sonra?; Well, now tell me all about it Hə, indi mənə o haqda hər şeyi danış/danışın*

**well-** [wel] *Mürəkkəb sözlərin komponenti kimi:* 1) yaxşı; **well-preserved** yaxşı qalmış; **well-dressed** yaxşı geyinmiş; 2) xeyir..., nəcib, ...əsil; **well-natured** xeyirxah, alicənab; **well-born** əsilzadə, nəcabətli; 3) tamam...; **well-content** tamam/tam razı

**we'll** [wi:l] *d.d.* = **we shall; we will**

**well-advised** ['weləd'vaızd] *adj* ağıllı, kamallı, tədbirli; **a ~ man** ağıllı/kamallı adam; **a ~ action** tədbirli hərəkət

**well-appointed** ['welə'pɔıntıd] *adj* yaxşı təchiz edilmiş; **a ~ hotel/apartment** yaxşı təchiz edilmiş mehmanxana/mənzil

**well-armed** ['wel'a:md] *adj* yaxşı silahlanmış; ~ **troops** yaxşı silahlanmış qoşun dəstələri

**well-balanced** ['wel'bælənst] *adj* 1. təmkinli, sakit, müvazinətli; **healthy, ~ young people** sağlam, təmkinli gənc adamlar; 2. müntəzəm; mütənasib; ahəngdar; yaxşı nizamlanmış *(yemək tərzi və yeməklər haq.)*; **a ~ diet** müntəzəm pəhriz

**well-becoming** ['welbı'kʌmıŋ] *adj* uyğun, münasib, əlverişli, yararlı, uyğun gələn; yaraşan

**well-behaved** ['welbı'heıvd] *adj* 1. ədəbli, əxlaqlı, tərbiyəli; xoşxasiyyət, xoşrəftar, özünü yaxşı aparan; **a ~ child** ədəbli/tərbiyəli uşaq; 2. əhliləşdirilmiş, təlim verilmiş, öyrədilmiş *(heyvanlar haq.)*; **a ~ dog** təlim öyrədilmiş/verilmiş it

**well-being** ['wel'bi:ıŋ] *n* 1. sağlamlıq, səhhət, cansağlığı; *The warm sunny weather always gives me a sense of well-being İsti günəşli hava həmişə məndə sağlamlıq/gümrahlıq hissi yaradır*; 2. salamatlıq, əmin-amanlıq; xoş güzəran, rifah, firavanlıq; **the ~ of nation** millətin xoş güzəranı/ rifahı; ~ **of troops** *hərb.* ordunun maddi təminatı

**well-beloved** ['welbı'lʌvd] *adj* çox sevimli/əziz

**well-boring** ['wel'bɔ:rıŋ] *n* quyu qazma

**well-born** ['wel'bɔ:n] *adj* əsilli, nəcabətli, əsilzadə, zadəgan

**well-bred** ['wel'bred] *adj* 1. yaxşı tərbiyə görmüş/ almış, tərbiyəli, ədəbli, nəzakətli; *She was too well-bred to show her disappointment*

*O elə tərbiyəli idi ki, məyusluğunu büruzə vermədi;* 2. cins *(at və s. haq.)*
**well-built** ['wel'bılt] *adj* 1. möhkəm; qədd-qamətli, boy-buxunlu, tən-dürüst; 2. yaxşı tikilmiş
**well-child-clinic** ['weltʃaıld'klınık] *n tib.* uşaq məsləhətxanası; sağlam uşaqlar üçün tibb məntəqəsi
**well-conditioned** ['welkən'dıʃənd] *adj* 1. mənəvi cəhətdən möhkəm, təmkinli, ədəbli, əxlaqlı; 2. möhkəm, sağlam, yaxşı formada olan; yaxşı qalmış; ~ **wound** normal/sağalan yara; 3. tərbiyəli, yaxşı ailədən çıxmış, mədəni
**well-conducted** ['welkən'dʌktıd] *adj* 1. tərbiyəli, ədəbli, nəzakətli; 2. yaxşı qoyulmuş *(iş və s.)*; yaxşı rəhbərliyi olan
**well-connected** ['welkə'nektıd] *adj* 1. yuxarı cəmiyyətdə geniş əlaqələri olan; 2. yaxşı /əsilzadə ailədən olan; 3. əlaqəli, məntiqi
**well-defined** ['weldı'faınd] *adj* aydın, dəqiq, yaxşı təyin/müəyyən olunmuş; ~ **patterns** yaxşı müəyyən olunmuş modellər/nümunələr
**well-deserved** ['weldı'zə:vd] *adj* layiq, ləyaqətli
**well-directed** ['weldı'rektıd] *adj* 1. sərrast, düz, mahir *(gülləatma, zərbə və s. haq.)*; 2. *məc.* hədəfə düz vuran/yönəldilən; ~ **effort** məqsədyönlü cəhd/səy
**well-dish** ['wel'dıʃ] *n* dərin dövrə/boşqab *(sous tökmək üçün)*
**well-disposed** ['weldıs'pouzd] *adj* **(to, towards)** xeyirxah, dost, iltifatlı, təvəccöh göstərən; *She seemed well-disposed towards us Onun bizə qarşı çox iltifatlı olması hiss olundu*
**well-doer** ['wel'du:əʳ] *n* 1. yaxşı/səxavətli/comərd adam; 2. hami, havadar, xeyirxah, xilaskar, pənah
**well-doing** ['wel'du:ıŋ] *n* xeyirxah işlər/hərəkətlər
**well-done** ['wel'dʌn] *adj* 1. yaxşı edilmiş, uğurlu; 2. yaxşı qızardılmış *(xüs. ət haq.)*; *He likes his steak well-done O, ətin yaxşı qızardılmasını istəyir/ xoşlayır*
**well-earned** ['wel'ə:nd] *adj* əməkdar; ləyaqətli; qazanılmış, əldə edilmiş; **a** ~ **rest** qazanılmış/layiq olan istirahət; ~ **praise** ləyaqətli/qazanılmış /layiq olan tərif
**well-educated** ['wel'edju:keıtıd] *adj* savadlı, təhsilli, yaxşı təhsil almış/görmüş
**well-favoured** ['wel'feıvəd] *adj* gözəl, cəzbedici, cazibədar
**well-fed** ['wel'fed] *adj* kökəldilmiş, kök; *The cat looked sleek and well-fed Pişik yaxşı bəslənmiş və kök görsənirdi*
**well-found** ['wel'faund] *adj* yaxşı təchiz edilmiş
**well-founded** ['wel'faundıd] *adj* = **well-grounded**
**well-groomed** ['wel'gru:md] *adj* 1. yaxşı qulluq edilmiş/baxılmış; təmizlənmiş; bəslənmiş *(at haq.)*; **a** ~ **horse** yaxşı bəslənmiş at; 2. səliqəli, təmiz, özünə xüsusi fikir verən, təmizkar *(qadın haq.)*; **a** ~ **woman** səliqəli/təmizkar qadın
**well-grounded** ['wel'graundıd] *adj* 1. əsaslı, əsaslandırılmış; inandırıcı; ~ **fears** əsaslı qorxu; 2. **(in)** yaxşı hazırlığı olan *(müəyyən bir fəndən)*; bələd, səriştəli; başı çıxan, məlumatlı
**well-head** ['welhed] *n* 1. bulaq, qaynaq; 2. **(of)** *məc.* mənbə, başlanğıc; dərya
**well-heeled** ['wel'hi:ld] *adj d.d.* 1. zəngin, varlı; 2. yaxşı silahlanmış
**well-informed** ['welın'fɔ:md] *adj* 1. məlumatlı, yaxşı məlumatı olan; *According to a well-informed source, one of the President's leading advisers is going to resign Etibarlı mənbədən verilən məlumata görə, Prezidentin baş müşavirlərindən biri istefaya getmək üzrədir;* 2. bilikli, erudisiyalı, yaxşı/dərin/ geniş biliyi olan
**Wellingtons** ['welıŋtənz] *n pl* uzunboğaz çəkmə
**well-intentioned** ['welın'tenʃənd] *adj* yaxşı / xeyirxah niyyətli, yaxşı məqsədli
**well-judged** ['wel'dʒʌdʒd] *adj* düşünülmüş, sərrast, yerli-yerində, münasib; vaxtında; ~ **reply** düşünülmüş/sərrast cavab; ~ **blow** sərrast zərbə
**well-kept** ['wel'kept] *adj* qaydasında/yaxşı saxlanılmış
**well-knit** ['wel'nıt] *adj* 1. möhkəm, etibarlı; möhkəm bitişdirilmiş/calanmış; 2. *məc.* həmrəy, yekdil, möhkəm birləşmiş; ~ **collective** həmrəy/yekdil kollektiv; ~ **organization** həmrəy/yekdil təşkilat; ~ **resistance** *hərb.* möhkəm/yaxşı hazırlanmış müdafiə; 3. möhkəm bədənli, cüssəli, qədd-qamətli *(adam haq.)*
**well-known** ['wel'noun] *adj* 1. məşhur, tanınmış, populyar; 2. hamıya məlum, geniş yayılmış, anlaşılan; **a** ~ **fact** hamıya məlum fakt; *It is well-known that too much sugar is bad for a man Hamıya məlumdur ki, çox şəkər adama ziyandır*
**well-lined** ['wel'laınd] *adj* içi pulla doldurulmuş, dopdolu *(cib kisəsi, pul kisəsi)*; ~ **pockets** pulla dolu ciblər
**well-looking** ['wel'lukıŋ] *adj* 1. gözəl/sağlam görkəmə malik olan; 2. cazibədar, füsunkar, cəzbedici; **a** ~ **woman** cazibədar/füsunkar/cəzbedici qadın
**well-made** ['wel'meıd] *adj* 1. qədd-qamətli, təndürüst; boylu-buxunlu, cüssəli; 2. bacarıqlı, məharətli, mahir, qabil; yaxşı qurulmuş *(fabula, məzmun)*; quruluş etibarı ilə mükəmməl *(pyes və s.)*
**well-mannered** ['wel'mænəd] *adj* ədəbli, nəzakətli, yaxşı tərbiyə almış/görmüş
**well-marked** ['wel'ma:kt] *adj* kəskin, aydın; ~ **differences** kəskin /aydın fərqlər
**well-meaning** ['wel'mi:nıŋ] *adj* xoşniyyət, xeyirxah; yaxşı niyyəti/məqsədi olan
**well-meant** ['wel'ment] *adj* = **well-intentioned**
**well-minded** ['wel'maındıd] *adj* = **well-disposed**
**well-natured** ['wel'neıtʃəd] *adj* = **good-natured**
**well-nigh** ['welnaı] *adv* demək olar ki, az qala, təqribən
**well-off** ['wel'ɔf] *adj* 1. dövlətli, varlı, varlı-dövlətli, varlı-hallı; 2. **(for)** yaxşı təmin olunmuş; ~ **for books** kitablarla tam təmin olunmuş/edilmiş
**well-oiled** ['wel'ɔıld] *adj* 1. yaxşı yağlanmış; 2. yaltaq; 3. *sl.* azca içmiş, azacıq keflənmiş
**well-ordered** ['wel'ɔ:dəd] *adj* sahmana/qaydaya/nizama salınmış, yoluna qoyulmuş
**well-paid** ['wel'peıd] *adj* yaxşı ödənilən, yaxşı haqq/ muzd verilən
**well-proportioned** ['welprə'pɔ:ʃənd] *adj* proporsional, mütənasib, bir əndazədə olan, taraz
**well-read** ['wel'red] *adj* 1. çox oxumuş, bilikli, məlumatlı; 2. **(in)** müəyyən bir sahə üzrə geniş biliyə/məlumata malik olan; *He is well-read in English literature O, ingilis ədəbiyyatını yaxşı bilir*
**well-regulated** ['wel'regjuleıtıd] *adj* müvafiq/müəyyən nəzarət altında olan; yaxşı nizama/qaydaya salınmış, yoluna qoyulmuş
**well-run** ['wel'rʌn] *adj* yaxşı fəaliyyət göstərən, yaxşı işləyən *(müəssisə, dükan və s.)*
**well-seeming** ['wel'si:mıŋ] *adj* yaxşı görünüşlü, yaxşı görsənən, yaxşı görkəmli
**well-set** ['wel'set] *adj* 1. möhkəm, möhkəm bədənli, enlikürək və cüssəli *(adam haq.)*; 2. möhkəm/bərk düzəldilmiş, kip taxılmış
**well-sinker** ['wel'sıŋkəʳ] *n* qazmaçı, buruq fəhləsi
**well-sinking** ['wel'sıŋkıŋ] *n* quyu/buruq quyusu qazma
**well-spoken** ['wel'spoukən] *adj* 1. yerində deyilmiş *(söz haq.)*; 2. zərif, gözəl, incə *(danışıq tərzi haq.)*
**well-spring** ['wel.sprıŋ] *adj* = **well-head**
**well-staircase** ['wel.steəkeıs] *n* dolama pilləkən
**well-tailored** ['wel'teıləd] *adj* 1. yaxşı, nəfis geyinmiş *(kişi haq.)*; 2. yaxşı tikilmiş
**well-thought-of** ['wel'θɔ:təv] *adj* yaxşı adı/hörməti olan, ehtiram edilən *(adam haq.)*
**well-thought-out** ['wel'θɔ:t'aut] *adj* əsaslı/hərtərəfli düşünülmüş *(plan və s. haq.)*
**well-timed** ['wel'taımd] *adj* vaxtında, vaxtında olan, əlverişli, yerində; ~ **advice** vaxtında edilən/verilən məsləhət; **a** ~ **intervention** vaxtında edilən müdaxilə
**well-to-do** ['weltə'du:] *adj* varlı, dövlətli, varlı-dövlətli, varlı-hallı; **luxury homes for the** ~ varlılar üçün zəngin evlər
**well-tried** ['wel'traıd] *adj* sınanılmış, təcrübədən/sınaqdan çıxmış; ~ **methods/remedies** sınaqdan/ təcrübədən çıxmış üsullar/dərmanlar
**well-trodden** ['wel'trɔdn] *adj* 1. işlək hala salınmış, tapdanmış; 2. *məc.* çeynənmiş
**well-turned** ['wel'tə:nd] *adj* 1. sərrast, düzgün, rəvan, səlis, yerində deyilmiş *(cümlə, ifadə və s. haq.)*; **a** ~ **compliment** sərrast / yerində deyilmiş kompliment; 2. düz, qəşəng biçimli, yaraşıqlı *(qıç və s. haq.)*
**well-water** ['wel'wɔ:təʳ] *n* quyu/bulaq suyu
**well-wisher** ['wel'wıʃəʳ] *n* xeyirxah adam; *They received many letters of sympathy from well-wishers Onlar xeyirxah adamlardan çoxlu başsağlığı məktubu aldılar*
**well-worn** ['wel'wɔ:n] *adj* 1. geyilmiş, nimdaş, əldən düşmüş *(paltar və s. haq.)*; **a** ~ **jacket** nimdaş jaket/ pencək; 2. çeynənmiş, köhnə *(zarafat və s. haq.)*;
◊ **a** ~ **story** ≅ lətifə, qaravəlli
**Well-wrought** ['wel'rɔ:t] *adj* 1. yaxşı edilmiş/düzəldilmiş; 2. yaxşı quraşdırılmış/yazılmış *(fabula və s. haq.)*
**Welsh**[1] [welʃ] *n* 1. **(the** ~**)** *top.i* uelslilər, keltlər, valliyalılar; 2. Valli/Uels/Kelt dili
**Welsh**[2] [welʃ] *adj* uelsli, valliyalı; ~ **cattle** Uels cinsindən olan mal-qara;
◊ ~ **rabbit/rarebit** qızardılmış çörək tikələri *(pendirlə)*
**Welshman** ['welʃmən] *n (pl* **-men** [-mən]) uelsli; Uels sakini, valliyalı
**Welshwoman** ['welʃ.wumən] *n (pl* **-women** [-.wımın]) uelsli, valliyalı *(qadın)*
**welt**[1] [welt] *n* 1. haşiyə, köbə, rant *(ayaqqabıda, başmaqda)*; 2. tikmə, köbələmə, haşiyə vermə *(paltara)*; 3. çapıq, iz *(qamçı izi)*; 4. *tex.* fals; köbə, tikiş yeri *(nazik dəmir təbəqəsinin bitişdiyi yer)*; 5. güclü zərbə *(qamçı ilə)*
**welt**[2] [welt] *v* 1. haşiyə/köbə tikmək, haşiyə vermək; rant qoymaq *(ayaqqabıya)*; 2. *d.d.* döyüb zol-zol etmək, döymək *(qamçı ilə)*; 3. haşiyə vurmaq/ tikmək, köbələmək, köbə tikmək *(paltara və s.)*
**welter**[1] ['weltəʳ] *n* hay-küy, həngamə, mərəkə, qiyamət, məhşər, ərəsat; qarmaqarışıqlıq, hərcmərclik, xaos; **a** ~ **of confused ideas** fikir hərcmərcliyi; **a** ~ **of information** məlumat qarmaqarışıqlığı
**welter**[2] ['weltəʳ] *v* 1. yerə sərilmək; ağnamaq; çapalamaq, çırpınmaq, əlləşmək; **to** ~ **in** *one's* **blood** qan gölü içində çapalamaq; **to** ~ **in pleasure** həzz almaq; 2. *məc.* batmaq; **to** ~ **in vice/in sin** günaha batmaq; 3. *şair.* şahə qalxmaq *(dalğa haq.)*; 4. *məc.* həyəcanlanmaq; təlatümə gəlmək; 5. dalğadan yırğalanmaq *(gəmi haq.)*
**welter-weight** ['weltəweıt] *n id.* 1. əlavə yük *(at yarışında)*; 2. orta çəki dərəcəsində pəhləvan/ boksçu; **a** ~ **champion** orta çəki dərəcəsində çempion
**wen** [wen] *n* 1. *tib.* piy şişi; 2. *tib.* zob, ur, boğaz uru; 3. çox böyük şəhər
**wench**[1] [wentʃ] *n* 1. cavan qadın, yetişmiş/cavan qız; 2. qız *(xüs. fahişə haq.)*; 3. kənd qızı; xidmətçi, qulluqçu
**wench**[2] [wentʃ] *v* əxlaqsızlıq etmək, pozğun həyat sürmək, arvadbazlıq etmək
**wend** [wend] *v arx.* **(to)** getmək, yollanmaq; **to** ~ *one's* **way** getmək, yollanmaq, istiqamət almaq
**went** [went] **to go** *felinin pt forması*
**were** [wə:] *(tam forma)*; [wə] *(zəif forma)* **to be** *felinin pt cəm forması*

**we're** [wɪə] *d.d.* = **we are**
**weren't** [wɜ:nt] *d.d.* = **were not**
**werewolf** [ˈwɜ:wulf] *n* qulyabanı
**west[1]** [west] *n* **1.** qərb; *dan.* uest; **to overlook the ~** qərbə doğru baxmaq *(pəncərə və s. haq.)*; *The wind is coming from the west Külək qərbdən əsir*; **2.** qərb, qərb tərəf; *She lives to the west of England O, İngiltərənin qərb tərəfində yaşayır*; **3. The West** *amer.* Birləşmiş Ştatların qərb tərəfi/ştatları; *She lived in the West for ten years O, on il Amerikanın qərbində yaşadı*
**west[2]** [west] *adj* **1.** qərb, qərbi; **~ wind** qərb küləyi; **West Berlin** Qərbi Berlin; *She lives on the west coast of the sea O, dənizin qərb sahilində yaşayır*; **2.** qərbə doğru açılan *(pəncərə və s.)*; **~ window** qərbə doğru açılan pəncərə
**west[3]** [west] *adv* qərbə, qərbə doğru/tərəf; **three miles ~ of here** buradan üç mil qərbə doğru; *The window faces west Pəncərə qərbə tərəf baxır*;
◊ **to go ~ 1)** ölmək; **2)** batmaq, qürub etmək *(günəş, ay haq.)*; **3)** yox olmaq
**West End** [ˈwestˈend] *n* Uest End, Londonun kübarlar yaşayan qərb hissəsi
**West Ender** [ˈwestˈendəʳ] *n* Uest End sakini *(bax:* **West-End)**
**westering** [ˈwestərɪŋ] *adj* **1.** qərbə tərəf istiqamətlənən *(səma cisimləri haq.)*; **2.** batan, qürub edən *(günəş haq.)*
**westerly[1]** [ˈwestəlɪ] *n pl dan.* uestlər, qərb küləkləri
**westerly[2]** [ˈwestəlɪ] *adj* qərb, qərbə doğru olan; **~ direction** qərb istiqaməti; **~ wind** qərb küləyi; **~ gales** qərb tərəfdən gələn fırtınalar/qasırğalar; *The room has a westerly aspect Otaq qərbə doğru çıxır*
**westerly[3]** [ˈwestəlɪ] *adv* qərbə, qərbə tərəf/doğru, qərbdən, qərb istiqamətində
**western[1]** [ˈwestən] *n* **1.** qərb sakini; **2.** *d.d.* kovboy romanı/filmi/pyesi/televiziya verilişi; **3.** qərb Roma-katolik kilsəsinin üzvü /tərəfdarı
**western[2]** [ˈwestən] *adj* qərbdə yaşayan; qərbə aid olan; **~ customs/philosophies** qərb adətləri/fəlsəfələri
**westerner** [ˈwestənəʳ] *n* **1.** qərb sakini; **2.** Uesterner *(ABŞ-ın qərb ştatlarında doğulmuş sakini)*
**westernmost** [ˈwestənmoust] *adj* lap qərbdə olan/qərbə doğru olan
**westing** [ˈwestɪŋ] *n dan.* qərbə dreyf *(gəminin külək və ya axının təsiri ilə yolundan kənara çıxması)*; qərbə doğru istiqamət alma, qərbə meyllənmə
**Westminister[1]** [ˈwestmɪnɪstəʳ] *n* **1.** Uestminister *(Londonun rayonu)*; **2.** ingilis parlamenti
**Westminister[2]** [ˈwestmɪnɪstəʳ] *adj* Uestminister; **~ Abbey** Uestminister abbatlığı *(məşhur adamların dəfn olunduğu məqbərə)*; **~ Palace** Uestminister sarayı *(İngiltərə parlamentinin binası)*
**westward[1]** [ˈwestwəd] *n* qərb, qərb istiqaməti
**westward[2]** [ˈwestwəd] *adj* qərb *(istiqamət haq.)*, qərbi, qərbə doğru hərəkət edən; **~ wind** qərb küləyi; **~ of smth.** bir şeydən qərbdə yerləşən
**westward[3]** [ˈwestwəd] *adv* qərbə, qərbə doğru, qərb istiqamətində/tərəfdə
**westwards** [ˈwestwədz] *adv* = **westward[3]**
**wet[1]** [wet] *n* **1.** nəmlik, rütubət, yaş; *There is some wet on the carpet Xalçada bir az nəmlik var*; **2.** yağışlı hava; *Come in out of the wet İçəri gir/girin, yağışın altında durma/durmayın*; **3.** *d.d.* içki, spirtli içkilər; **4.** *amer. sl.* spirtli içkilərin azad satışının tərəfdarı; **5.** *sl.* yaramaz/dəyərsiz/ vecsiz adam; **Tory ~s** Tori partiyasının vecsiz/ yaramaz üzvləri
**wet[2]** [wet] *adj* **1.** nəm, yaş, rütubətli, qurumamış; **~ clothes** nəm/yaş paltarlar; **~ grass** nəm/yaş ot *(göy)*; **~ roads** yaş yollar; **~ timber** yaş/nəm oduncaq; **~ paint** qurumamış rəng; **~ to the skin, ~ through** sümüyəcən /iliyəcən islanmış; təpədən-dırnağacan islanmış; **to get ~** islanmaq; **dripping/soaking/wringing ~** bərk/ sümüyəcən islanmış, suyu damcılayan; **2.** yağışlı, yağmurlu, nəm, rütubətli *(hava haq.)*; **~ weather** nəm/ rütubətli hava; **~ day** rütubətli/yağmurlu gün; *London gave us a wet welcome London bizi yağışla qarşıladı*; **3.** duru, maye, sıyıq *(palçıq, qatran və s. haq.)*; **~ mud** sıyıq palçıq; **~ gas** maye qaz; **~ fuel** maye/duru yanacaq; **4.** gözləri yaşlı, ağlamsınmış; **~ smile** göz yaşları içərisində təbəssüm; **5.** *amer.* spirtli içkilərin satışına icazə verən yaxud icazə verilməsi tərəfdarı; **~ state** spirtli içkilərin satışına icazə verən ştat; **6.** səfeh, mənasız, məntiqsiz; **to talk ~** məntiqsiz/cəfəngiyyat danışmaq, çərənləmək; **7.** *d.d.* sərxoş, içmiş; **~ night** içki məclisi;
◊ **~ wash** camaşırxanadan nəm/qurumamış alınan paltar; **~ fish 1)** duzlu balıq; **2)** təzə balıq; **~ behind the ears** ≅ ağzından süd iyi gələn, təcrübəsiz; **~ to the skin** sümüyəcən/iliyəcən islanmış
**wet[3]** [wet] *v (pt, pp* **wet** *və ya* **wetted) 1.** yaş/nəm etmək, islatmaq; **to ~ with water** su ilə islatmaq; **to ~ one's feet** ayaqlarını islatmaq; **2.** işəmək, siymək; sidiyini saxlaya bilməmək; **to ~ one's bed** yorğan-döşəyinə işəmək/siymək; **3.** *d.d.* çiləmək, səpmək; **to ~ the flowers** güllərə su səpmək/çiləmək; **~ out 1)** yaş etmək, islatmaq; **2)** yumaq, yuyub təmizləmək;
◊ **to ~ one's whistle** boğazını islatmaq, içmək, kef etmək; **to ~ a bargain** sövdələşmək, dilbir olmaq; **to ~ the other eye** ikinci badəni içmək
**wet-blanket[1]** [ˈwetˈblæŋkɪt] *n d.d.* başqasının səvincini/kefini və s. pozan/zəhərləyən adam; başqasının kefinə soğan doğrayan; *She is such a wet-blanket O başqasının kefinə soğan doğrayandır*
**wet-blanket[2]** [ˈwetˈblæŋkɪt] *v d.d.* inamını qırmaq/ sarsıtmaq *(bir kəsin)*; ruhdan salmaq/ çaşdırmaq *(bir kəsi)*; kefinə soğan doğramaq *(bir kəsin)*



**wet-bob** [ˈwetˈbɔb] *n* su idmanı ilə məşğul olan şagird; avarçı, avarçəkən
**wether** [ˈweðəʳ] *n* **1.** buruq/axta qoç; **2.** *məc.* axta, xədim *(adam)*
**wether-gammon** [ˈweðə.gæmən] *n aşp.* qoyun ayağı
**wether-head** [ˈweðəhed] *n məc.* qoyunbaş, gic, sarsaq, axmaq, qanmaz
**wet-look** [ˈwetluk] *adj* parıltılı; **a ~ leather coat** parıltılı dəridən olan pencək
**wet-nurse[1]** [ˈwetnə:s] *n* süd anası *(başqasının uşağına süd verən qadın)*; dayə; **to play ~** dayəlik etmək, başqasının uşağına süd vermək
**wet-nurse[2]** [ˈwetnə:s] *v* **1.** döş vermək; əmizdirmək *(başqasının uşağını)*; dayəlik etmək; **2.** *məc.* əldən-ayaqdan getmək, başına fırlanmaq, nazını çəkmək *(bir kəsin)*
**we've** [wi:v] *d.d.* = **we have**
**whack[1]** [wæk] *n* **1.** *d.d.* bərk zərbə; zərbə səsi; *He gave the ball a terrific whack O, topa bərk bir zərbə vurdu*; **2.** *d.d.* təşəbbüs; sınama, yoxlama; *I failed my test first time, but I'm having another whack at it Mən ilk dəfə testdən kəsildim, lakin başqa bir təşəbbüsdə bulunmaq istəyirəm*; **3.** *d.d.* şərik, qanuni pay, qanuni çatmalı hissə; **to go ~s** bir kəslə şərik olmaq; **to have one's ~ of smth.** bir şeydən çatacaq payı almaq;
◊ **to be out of ~** nasaz olmaq; *The motor is out of whack Motor/Mühərrik nasazdır*
**whack[2]** [wæk] *v* **1.** vurmaq, döymək, əzişdirmək; zərbə endirmək; **2.** *d.d.* bölmək; bölüşmək *(payı; həm də* **to ~ up)**
**whacked** [wækt] *adj d.d.* əldən/taqətdən düşmüş, üzülmüş; *I'm absolutely whacked Mən tamamilə əldən /heydən düşmüşəm*
**whacking** [ˈwækɪŋ] *adj d.d.* zorba, böyük, çox yekə; **a ~ lie** böyük/zorba yalan; **a ~ great bruise** çox yekə qançır/əzik
**whale[1]** [weɪl] *n* **1.** kit, balina; *There are several different types of whales, some of which are hunted Bir sıra müxtəlif növ balinalar mövcuddur/vardır, onlardan bəzisi ovlanır*; **bull ~** erkək balina/kit; **cow ~** dişi balina/kit; **2.** çox iri/yekə; zorba; çox yaxşı şey; **a ~ of a story** çox yaxşı bir hekayə; **3.: a ~ at/on** *d.d.* öz işinin ustası/pərgarı, öz işini yaxşı bilən; usta/təcrübəli adam; *He is a whale on/at history O, tarixi yaxşı biləndir, O, tarixin bilicisidir*;
◊ **to have a ~ of a time** çox yaxşı vaxt keçirmək, çox yaxşı əylənmək; *The children had a whale of a time at the fair Uşaqlar yarmarkada çox yaxşı əyləndilər*
**whale[2]** [weɪl] *v* I balinaları/kitləri öldürmək, balina/ kit ovlamaq
**whale** [weɪl] *v* II *amer. d.d.* **1.** döymək, vurmaq *(çubuqla)*; qolaylanaraq vurmaq; **2.** düşməni darmadağın etmək
**whale-boat** [ˈweɪlbout] *n* **1.** balina/kit ovlayan gəmi; **2.** velbot *(avarlı və ya yelkənli uzun qayıq)*
**whalebone** [ˈweɪlboun] *n* **1.** balina/kit sümüyü *(üst çənədə)*; **2.** balina/kit sümüyündən düzəldilən məmulat/şey
**whale-calf** [ˈweɪlka:f] *n (pl* **calves** [-ka:vz] balina /kit balası
**whale-fin** [ˈweɪlfɪn] *n arx.* = **whalebone**
**whale-fisher** [ˈweɪl.fɪʃəʳ] *n* balina/kit ovçusu, balina/kit ovlayan
**whale-fishery** [ˈweɪl.fɪʃərɪ] *n* balina/kit ovlama, balina/kit ovçuluğu
**whaleman** [ˈweɪlmən] *n* **1.** *(pl* **-men** [-mən]) balina/kit ovçusu, balina/kit ovlayan *(adam)*; **2.** balina/kit ovlayan gəmi
**whale-oil** [ˈweɪlɔɪl] *n* balina yağı, dəniz heyvanlarının *(balina, suiti və s.)* əridilmiş piyi
**whaler** [ˈweɪləʳ] *n* **1.** balina/kit ovlayan *(adam)*; balina/kit ovçusu; **2.** balina/kit ovlayan gəmi; **3.** *dan.* velbot *(avarlı/yelkənli uzun qayıq)*
**whaling[1]** [ˈweɪlɪŋ] *n* I balina/kit ovu, balina/kit ovçuluğu
**whaling** [ˈweɪlɪŋ] *n* II *d.d.* döymə, vurma, qolaylanaraq vurma *(çubuq və s. ilə)*
**whaling[2]** [ˈweɪlɪŋ] *adj* **1.** balina, kit; **~ fleet** balina/kit ovlayan donanma; **2.** yekə, zorba; qeyri-adi
**whaling-gun** [ˈweɪlɪŋgʌn] *n* qarpun topu *(qarpun atan top – böyük dəniz heyvanlarını ovlamaq üçün nizə, qarmaq)*
**whang[1]** [wæŋ] *n d.d.* bərk/ağır zərbə
**whang[2]** [wæŋ] *v* çalmaq, vurmaq; döyəcləmək *(təbili)*
**wharf** [wɔ:f] *n (pl* **-ves** [vz]; **-fs** [-vs]) **1.** verf, tərsanə *(gəmi qayrılan və təmir edilən yer)*; **2.** körpü *(gəminin yan alması üçün)*
**wharfage** [ˈwɔ:fɪdʒ] *n dan.* **1.** yan alma rüsumu/ vergisi; körpü rüsumu/vergisi; **2.** körpüdə yükləri saxlama xərci/rüsumu
**wharfinger** [ˈwɔ:fɪndʒəʳ] *n dan.* **1.** körpü sahibi/ müdiri; **2.** gəmi sahibinin körpüdə nümayəndəsi
**wharf-rat** [ˈwɔ:fræt] *n məc.* liman/port siçovulu *(avaralar, oğrular və s. haq.)*
**wharves** [wɔ:vz] **wharf** *isminin cəm forması*
**what[1]** [wɔt] *pron* **1.** *inter. pron.* nə?; *What is it? Bu nədir? What do you mean? Nə demək istəyirsən?/ istəyirsiniz? What is it made of? Bu nədən düzəldilib?; What is your name? Sənin/Sizin adın/ adınız nədir? What? What did you say? Repeat, please! Nə? Nə dedin/dediniz? Zəhmət olmasa, təkrar et/edin; What about? Nə var, nə yox? Təzə nə var? What about your promise? Vədin/Vədiniz haqqında nə deyə bilərsən?/bilərsiniz? What are their names? Onların adı nədir? What is the French for "dog?" "İt" sözü fransızca necədir? What is he like? O necə adamdır?* **2.** *Miqdar bildirmək üçün işləndikdə:* nə qədər, neçə; *What did he pay for it? O buna nə qədər pul verdi? What is the time? Saat neçə-*

*dir? What do 7 and 8 make? 7 və 8 neçə/nə qədər edir? What are potatoes to-day? Bu gün kartof neçəyədir?* 3. nə, nəsə bir şey; *Show me what you've bought Nə aldığını/aldığınızı mənə göstər/ göstərin; I believed what he told me Onun mənə söylədiklərinə inandım; What worries me is how we're going to pay for all this Məni narahat edən odur ki, biz bütün bunları necə ödəyəcəyik?; She told me what to do O mənə nə edəcəyimi söylədi/dedi;* 4. kim, nəçi *(sənət, peşə etibarilə); What is he? O nəçidir? O nə sənət sahibidir?; What do you take me for? Sən/Siz məni nə hesab edirsən /edirsiniz?* 5. *Təəccüb, həzz, nifrət və s. hissləri ifadə etdikdə işlənir: What for? Nəyə görə? Nə üçün? What if...? Birdən?, Nə olar? Birdən ... necə olar/onda necə? What if the train is late? Birdən qatar gecikdi, necə olar? What if she forgets to bring the book? Birdən o, kitabı gətirməyi unutdu, onda necə?; What kind of man is he? O necə /nə təhər adamdır?; What a fool that man is! O kişi necə də axmaqdır; What a pity! Çox təəssüf! What beautiful weather! Necə də gözəl havadır!* ~ **though**...? nə olsun ki? *What are we the better for it all? Bütün bunların bizə nə xeyri var ki?*

◊ *So what? Hə, nə olsun? What's what Nə necədir; She certainly knows what's what O, nəyin necə olacağını, əlbəttə, bilir*

**what²** [wɔt] *conj* 1. *Vasitəli suallarda və budaq cümlələrdə işlənir:* ki..., nə..., nə qədər; *See what courage can do! Gör/Görün, cəsarət/igidlik nəyə qadirdir! I don't know what she wants Mən bilmirəm ki, o nə istəyir; What he says is true O nə deyirsə doğrudur/həqiqətdir; What he expected has happened O, nə gözləyirdisə, o da baş verdi, Onun gözlədiyi baş verdi; He does not know what he wants O nə istədiyini bilmir; I know what to do Mən nə edəcəyimi bilirəm;* 2. kim; *I know what she shall be Mən onun nə /kim olacağını bilirəm;* 3. nə qədər; *I asked him what he paid Mən ondan nə qədər pul ödədiyini soruşdum;* 4. *emf. var.* necə! nə!; *What a strange phenomenon! Necə də qeyri-adi hadisə! What an interesting book it is! Necə də maraqlı kitabdır! What a pity! Çox heyf, Çox təəssüf; What a fool he is! O necə də səfehdir! O necə də axmaqdır!*

◊ **(and)** ~ **not** daha nələr, və ilaxır, və s.; *What matter! Bu, əhəmiyyətsizdir! I know what I know Özüm bilirəm; What is what Nə nədir; She knows what's what O nəyin nə olduğunu bilir; What on earth (in the blazes, in the world) do you mean? Allahü-əkbər! Allah xatirinə nə demək istəyirsən/ istəyirsiniz; What on earth is he doing here? Onun burada nə ölümü var? Allahü-əkbər, o burada nə edir?*

**whate'er** [wɔt'eə^r] *pron* = **whatever**

**whatever¹** [wɔt'evə^r] *adj* hansı, necə, hansı olursa olsun, hər cür; *Whatever order he may give, they must be obeyed O hansı əmri verirsə versin, onlar yerinə yetirilməlidir*

**whatever²** [wɔt'evə^r] *dem. pron.* nə, hər nə; *You can eat whatever you like Xoşladığını/Xoşladığınızı yeyə bilərsən/bilərsiniz; Whatever we do, some people will criticize it Hər nə etsək də bəzi adamlar onu tənqid edəcəklər; Keep calm whatever happens Hər nə baş versə də, sakit ol/olun; I am right whatever you think Sən/Siz nə fikirləşirsənsə/ fikirləşirsinizsə fikirləş/fikirləşin, mən haqlıyam; Whatever happens, he is safe Hər nə baş verirsə- versin, ona heç nə olmayacaq;*

◊ **or** ~ və ilaxır, və s.; *There is a useful cupboard under the stairs for brushes, boots or whatever Pilləkənlərin altında firçalar, çəkmələr və s. üçün çox yararlı bir şkaf var*

**whatever³** [wɔt'evə^r] *adv* heç bir; hər hansı; *He has no chance whatever Onun heç bir imkanı/şansı yoxdur; There can be no doubt whatever about it O haqda heç bir şübhə ola bilməz; Is there any hope whatever? Heç bir ümid varmı? I can see nothing whatever Mən heç bir şey görə bilmirəm*

**whatever⁴** [wɔt'evə^r] *interj. təəccüb, çaşqınlıq və s. ifadə etdikdə:* nə! *Whatever do you mean? Sən/Siz nə demək istəyirsən?/istəyirsiniz? Whatever it can be? O nə ola bilər? Whatever happened to old Sam? Qoca Samə nə olub?*

**what-for** [wɔt'fɔ:^r] *n d.d.* 1. töhmət, məzəmmət; 2. cəza; kötək; *If she finds out what you've done she'll give you what for! O müəyyən etsə ki, sən/ siz nə etmisən/etmisiniz, o sənə/sizə cəza verəcək*

**Whatman** ['wɔtmən] *n* vatman kağızı *(həm də* ~ **paper)**

**what-not** ['wɔtnɔt] *n* 1. oyuncaqlar və s. üçün etajerka; 2. nə desən, nə istəsən, hər şey, cürbəcür şeylər; oyun-oyuncaq; *The box was full of old toys, books and what not? Qutuda köhnə oyuncaqlar, kitablar və daha nələr yox idi*

**wheat** [wi:t] *n* 1. buğda; **winter/summer** ~ payızlıq/yazlıq buğda; 2. taxıl; **a field of** ~ taxıl tarlası/zəmisi; **to grow/to plant** ~ buğda/taxıl yetişdirmək/əkmək

**wheat-bread** ['wi:t'bred] *n* buğda çörəyi, ağ çörək

**wheaten** [wi:tn] *adj* buğdayı, buğdayı rəngli, buğdadan hazırlanmış

**wheat-flour** ['wi:t.flauə^r] *n* buğda unu

**wheat-land** ['wi:tlænd] *n* buğda/taxıl zəmisi

**wheatmeal** ['wi:tmi:l] *n* iri üyüdülmüş buğda unu

**wheedle** [wi:dl] *v* 1. yaltaqlanmaq, yaltaqlıq etmək *(bir kəs qarşısında); The girl wheedled her father into buying her a bicycle Qız atasına velosiped aldırmaq üçün yaltaqlandı;* 2. yaltaqlanmaqla ələ keçirmək/qoparmaq; dilə tutmaq, tovlamaq *(bir şey almaq üçün); She wheedled the money out of her father O, atasını dilə tutmaqla ondan bir az pul qopardı;* **to** ~ **a gift out of/from**



**smb.** bir kəsi dilə tutmaqla hədiyyə almaq/qoparmaq; **to** ~ **smb. into doing smth.** yaltaqlanmaqla bir kəsi bir şey etməyə vadar/ məcbur etmək; **to** ~ **smth. out of smb.** tovlayıb/dilə tutub bir kəsdən bir şeyi almaq; 2. *məc.* soxulmaq, girmək, özünə yol açmaq; *He managed to wheedle his way into the party O, partiyaya soxula/girə bildi; He wheedled his way into the building O, binaya girə bildi; He wheedled his way into the stage O, özünü aktyorluğa soxa bildi/soxdu*

**wheedling** ['wi:dlɪŋ] *adj* yaltaq, qılığagirən; ~ **speech** yaltaq nitq

**wheel¹** [wi:l] *n* 1. təkər, çarx; **front/back** ~ qabaq/dal təkər; **on the** ~, **on** ~**s** təkər üstündə; köçəri həyat; 2. sükan, şturval *(gəmidə, təyyarədə, avtomobildə);* **man at the** ~ sükançı; rəhbər; 3. *məc.* ailə başçısı, rəhbər; *Here's a picture of me at the wheel of my new car Budur təzə maşınımın sükanı arxasında mənim şəklim; This is the first time I've sat behind the wheel since the accident Qəzadan sonra mən ilk dəfədir ki, sükan arxasında oturmuşam;* 4. *pl* mexanizm, hərəkətverici qüvvələr; minik, maşın; **the** ~**s of state** dövlət maşını/mexanizmi; *I can't come – I don't have any wheels Mən gələ bilmərəm – mənim heç bir miniyim/maşınım yoxdur;* 5. dairə, dövrə; **to turn** ~**s** dövrə vurmaq; mayallaq aşmaq/ vurmaq; 6. çəhrə; 7. dulusçuluq dairəsi/ sahəsi *(həm də* **potter's** ~*);* 8. bəxt, tale *(həm də* **fortune's** ~*);* **at the next turn of the** ~ bəxt/tale dönəndə, bəxt gətirməyəndə; 9. nəqərat; 10. *amer.* velosiped; 11. uşaq arabası/kolyaskası; 12. *hərb.: Right/Left wheel! Sağ/Sol çiyin üstə irəli!*

◊ **to break on the** ~ *tar.* təkərləmək, təkərə bağlayıb əzabla öldürmək *(qədim cəza üsulu);* **to break a butterfly/a fly on the** ~ ≅ yağ kimi getmək; ~**s within** ~**s** mürəkkəb əlaqə/vəziyyət; *There are wheels within wheels in this organization – you never really know what's going on Bu təşkilatda mürəkkəb vəziyyət mövcuddur – bilinmir ki, orada həqiqətən nə baş verir;* **to put one's shoulder to the** ~ işə can-başla girişmək; **to put a spoke into smb.'s** ~**s** ≅ bir kəsə badalaq gəlmək/əngəl törətmək/mane olmaq

**wheel²** [wi:l] *v* 1. diyirlətmək, gillətmək, gillədə-gillədə/itələyə-itələyə aparmaq *(əl arabasını, taçkanı);* **to** ~ **the cart into the yard** arabanı itələyə-itələyə həyətə aparmaq; *The nurse wheeled the trolley up to the bed Dayə ayaqları diyircəkli, balaca stolu düz çarpayının yanına apardı;* 2. **(round, around, about)** dönmək, dövrə vurmaq, fırlanmaq, hərlənmək; *The woman wheeled round to face her accusers Qadın ittihamçıların üzünə baxmaq üçün döndü/çevrildi; The sails of the windmill were wheeling round Dəyirmanın pərləri fırlanırdı/hərlənirdi; Seagulls wheeled in the air above me Başımın üstündə qağayılar dövrə vururdu;* 3. velosiped sürmək, velosipeddə getmək; 4. *hərb.* cinahdan girmək; 5. *tar.* təkərləmək, təkərə bağlayıb əzabla öldürmək;

◊ **to** ~ **and deal** *d.d.* hiylə /fənd işlətmək; fırıldaqla məşğul olmaq; *There will be a lot of wheeling and dealing before an agreement is reached Saziş əldə edilməzdən əvvəl çoxlu fənd/hiylə işlənəcək*

**wheel and axle** ['wi:lənd'æksl] *n tex.* çığrıq; quyu çarxı, dolamaçarx

**wheel arm** ['wi:l'a:m] *n tex.* təkərin mili

**wheelbarrow** ['wi:l.bærou] *n* taçka, əl arabası

**wheel-base** ['wi:lbeɪs] *n* avtomobil təkəri bazası

**wheelbox** ['wi:lbɔks] *n dən.* şturval qutusu

**wheel chair** ['wi:l'tʃeə^r] *n* təkərli kreslo, qoltuqlu kürsü *(şikəstləri, əlilləri aparmaq üçün)*

**wheeled** [wi:ld] *adj* təkərli, təkəri olan; **a sixteen-**~ **lorry** on altı təkərli yük maşını

**wheeler** ['wi:lə^r] *n* 1. taçka sürən/əl arabası sürən fəhlə; 2. = **wheelwright**; 3. orta at *(üçatlı qoşquda ortaya qoşulan at)*

**wheeler-dealer** ['wi:lə'di:lə^r] *n amer. d.d.* 1. başçı; 2. fırıldaqçı, bic, hiyləgər, tülüngü, lotubambılı *(həm də* **wheeler and dealer)**

**wheel-horse** ['wi:lhɔ:s] *n* = **wheeler** *(3-cü mənada)*

**wheel-house** ['wi:lhaus] *n dən.* sükan budkası

**wheeling** ['wi:lɪŋ] *n* 1. velosiped sürmə, velosipeddə getmə; 2. dönmə, dövr etmə, fırlanma; 3. yolun vəziyyəti; **good** ~ yaxşı yol, yaxşı vəziyyətdə olan yol

**wheelman** ['wi:lmən] *n (pl* **-men** [-mən]) *d.d.* 1. sükançı; 2. təkərçi, təkər qayıran usta; 3. velosipedçi, velosiped sürən

**wheelsman** ['wi:lzmən] *n (pl* **-men** [-mən]) sükançı

**wheelwright** ['wi:lraɪt] *n* 1. təkər ustası, təkərçi; 2. kuzov/təkər təmir edən usta

**wheeze¹** [wi:z] *n* 1. tövşümə; ağır nəfəsalma, təngnəfəslik; xırıltı; *He has a slight wheeze in his chest Onun sinəsində balaca bir xırıltı/təngnəfəslik var;* 2. *teatr. sl.* özündən uydurma/qondarma *(təlxək və s.);* 3. *d.d.* zarafat, məzəli söz, lətifə, anekdot; **a good** ~ ağıllı lətifə/anekdot; 4. çeynənmiş/köhnə fənd/hoqqa; hamıya məlum oyun/kələk

**wheeze²** [wi:z] *v* 1. xoruldamaq; fısıldamaq; tövşümək; təngnəfəs olmaq; *He was coughing and wheezing all night O, bütün gecəni öskürür və təngnəfəs olurdu; By the time he reached the top of the stairs he was panting and wheezing O, pilləkənlərin başına çatanda tövşüyür və təngnəfəs olurdu;* 2. xırıldamaq *(həm də* **to** ~ **out**)*; "I've got a sore throat", he wheezed "Mənim boğazım ağrıyır", o, xırıltılı səslə dedi*

**wheezy** ['wi:zɪ] *adj* 1. təngnəfəslikdən/astmadan əzab çəkən; *My cold's getting better but I'm still a bit wheezy Soyuqdəyməm getdikcə keçir, an-*

*caq mən hələ də bir az təngnəfəsəm;* 2. xırıltılı; a ~ **chest/laugh/voice** xırıltılı sinə/ gülüş / səs

**whelk** [welk] *n* 1. sızanaq; 2. *d.d.* çapıq, kərtik

**whelm** [welm] *v* 1. *şair.* tökmək *(su)*, söndürmək *(su ilə)*; 2. doldurmaq, tökmək, örtmək *(torpaqla, qarla və s.)*; 3. *məc.* udmaq; əhatə etmək, bürümək; *Sorrow whelmed his soul Kədər/Qəm/Qüssə onun qəlbini bürümüşdü;* 4. *dial.* **(over, upon)** örtmək *(bir şeyi)*; salmaq, çəkmək *(bir şeyin üzərinə)*

**whelp**[1] [welp] *n* 1. küçük, it balası/küçüyü; bala *(vəhşi heyvanların)*; 2. *kin.* cins, nəsil; uşaq, küçük *(gənc haq.)*

**whelp**[2] [welp] *v* 1. küçükləmək, balalamaq *(it, tülkü, canavar və s. haq.)*; 2. *kin.* doğmaq, dünyaya gətirmək

**when**[1] [wen] *n* vaxt, zaman; *Since when has she been ill? O nə vaxtdan/zamandan xəstədir? He came a week ago, since when he has had no rest O bir həftə bundan əvvəl qayıdıb və o vaxtdan dincəlməyib; Until when can you stay Sən/Siz nə vaxta qədər qala bilərsən?/bilərsiniz? He told me the when and the why of it O mənə bunun nə vaxt və nə üçün baş verdiyini danışdı; By when must you be there? Nə vaxt sən/siz orada olmalısan/olmalısınız*

**when**[2] [wen] *interrog. adv* nə vaxt/zaman; *When can you come? Sən/Siz nə vaxt gələ bilərsən? /bilərsiniz; When did he die? O nə vaxt öldü? I don't know when he died Mən onun nə vaxt öldüyünü bilmirəm; When were you living in Spain? Sən/Siz İspaniyada nə vaxt yaşayırdın?/ yaşayırdınız?*

**when**[3] [wen] *rel. adv* **(time, day, month** *və s. sözlərdən sonra işlənir) It happened at the time when we were young Bu biz cavan olanda baş verdi; Sunday is the day when I am least busy Bazar günü mənim ən az məşğul olduğum gündür*

**when**[4] [wen] *conj.* 1. ...də, ...da; -kən; *It was ten o'clock when he returned home O, evə gələndə saat on idi; Be careful when crossing the street Küçəni keçəndə/keçərkən ehtiyatlı ol/olun; When I was young I used to go to the cinema very often Mən gənc /cavan olanda çox tez-tez kinoya gedərdim;* 2. ...dən/...dan sonra; *I'll go when I have had dinner Mən nahar edəndən sonra gedəcəm; You can go when the work is finished İş qurtardıqdan sonra sən/siz gedə bilərsən/bilərsiniz;* 3. baxmayaraq ki, halda; *They built the bridge in three months when everyone thought it would take a year Onlar körpünü üç aya tikdilər, baxmayaraq ki, hamı fikirləşirdi ki, o bir il çəkəcək; How dare you blame me when you are just as much to blame? Sən/Siz elə mənim qədər günahkar olduğun/ olduğunuz halda məni necə günahlandıra bilərsən/ bilərsiniz?* 4. əgər, bir halda ki, madam ki; *How convince him when he will not listen Bir halda ki, o qulaq asmır, onu necə inandırmaq olar*

**whence**[1] [wens] *interrog. adv* 1. haradan, hansı yerdən *(həm də* **from** ~ *); Whence does he come? O haralıdır? From whence is he? O haradandır?;* 2. necə, nə cür, hansı yolla? nə səbəbə; *Whence comes it that...? Bu necə olur ki...? Whence all this confusion? Nə səbəbə/Nəyə görə belə qarmaqarışıqlıqdır/çaxnaşmadır?*

**whence**[2] [wens] *conj.* haradan; *Go back whence you came Haradan gəlmisənsə/gəlmisinizsə, oraya da qayıt/qayıdın; They returned whence they came Onlar gəldiyi yerə qayıtdılar*

**whenever**[1] [wen'evə^r] *adv d.d.* axı nə vaxt/nə zaman; *I'll discuss it with you whenever you like İstədiyin vaxt/zaman mən onu səninlə müzakirə edərəm; Whenever did you find time to write it? Sən/Siz axı nə vaxt onu yazmağa vaxt tapdın/tapdınız? Whenever will he arrive? He's very late Axı o nə vaxt gələcək? O çox gecikir*

**whenever**[2] [wen'evə^r] *conj.* hər vaxt, hər dəfə, nə vaxt ki, nə zaman ki; *Whenever I come here it rains! Mən hər dəfə bura gələndə yağış yağır; Whenever I see her, she is smiling Mən hər dəfə onu gülümsəyən görürəm; I hope you will come whenever you feel inclined Mən ümid edirəm ki, sən/siz istədiyin/istədiyiniz vaxt gələcəksən/ gələcəksiniz; The roof leaks whenever it rains Nə zaman yağış yağırsa, damdan damır; I can meet you whenever you like İstədiyin/İstədiyiniz vaxt mən səni/sizi qarşılaya bilərəm; Whenever she comes, she brings a friend O hər dəfə gələndə özü ilə dostlarından birini gətirir*

**where**[1] [weə^r] *n* hadisənin baş verdiyi yer; *The wheres and whens are important Hadisənin harada və nə vaxt baş verdiyi vacibdir*

**where**[2] [weə^r] *interrog. adv* 1. harada, hara; *Where are you? Sən/Siz haradasan/haradasınız?; Where do you live? Sən/Siz harada yaşayırsan/yaşayırsınız? Where is the nearest post office? Ən yaxın poçt şöbəsi haradadır? I asked her where she was going Mən ondan hara getdiyini soruşdum; Sit where you like İstədiyin/İstədiyiniz yerdə otur/oturun;* 2. haradan? hansı mənbədən? *Where did you hear that tale? Bu nağılı/dedi-qodunu haradan eşitmisən?/ eşitmisiniz? Where does she come from? O haradandır? O haralıdır?*

**where**[3] [weə^r] *rel. adv Azərbaycan türkcəsinə tərcümə olunmur; The place where we lived is not far from here Bizim yaşadığımız yer buradan uzaqda deyil; That's the place where the accident occurred Bu, qəzanın baş verdiyi həmən yerdir*

**where**[4] [weə^r] *conj* 1. elə yerə, ora; *Send him where he will be well taken care of Onu elə yerə göndərin ki, orada ona yaxşı qulluq etsinlər/baxsınlar; I am where I should be Mən olmalı olduğum yerdəyəm; Where food is hard to find, few birds remain throughout the year Qida çətin tapılan yerlərdə bütün il boyu az quş-*



*lar qalır;* 2. ora, hara, harada, haradan; *Go where you please İstədiyin/İstədiyiniz yerə get/gedin, Haranı istəyirsən/istəyirsiniz, ora da get/gedin*

**whereabouts**[1] ['weərəbauts] *n* olduğu yer; *Her present whereabouts is unknown Onun hal-hazırda olduğu yer naməlumdur*

**whereabouts**[2] ['weərəbauts] *interrog. adv* harada? haradan? hara? hansı yerdə/yerdən? *Whereabouts did you find it? Onu hansı yerdən /haradan tapdın?/ tapdınız? Whereabouts are you? Sən/Siz haradansan?/ haradansınız? Whereabouts did you put it? Sən/Siz onu hara qoydun?/qoydunuz?*

**whereas** [weər'æz] *conj.* 1. halbuki, əksinə, baxmayaraq ki; *Some people like fatty meat, whereas others hate it Bəzi adamlar yağlı ət xoşlayır, halbuki digərləri onu xoşlamır/ digərlərinin ondan zəhləsi gedir; He was spending all his time on teaching, whereas he yearned to do research work O, vaxtının hamısını dərs deməyə sərf edirdi, halbuki o, tədqiqat işi aparmağın həsrətini çəkirdi; We thought she was rather arrogant, whereas in fact she was very shy Biz elə düşünürdük /bilirdik ki, o çox təkəbbürlüdür/ lovğadır, lakin əslində o çox utancaqmış;* 2. nəzərə alaraq *(rəsmi sənədlərin preambulasında işlənir)*

**whereat**[1] ['weər'æt] *relat. adv* harada, o yerdə ki *(Adətən Azərbaycan türkcəsinə tərcümə edilmir);* **the spot ~ he kept his watch** onun saatını saxladığı yer

**whereat**[2] ['weər'æt] *conj.* sonra, ondan sonra; *The man turned to leave, whereat she began to weep Kişi döndü ki, çıxıb getsin, onda o, hönkürtü ilə ağlamağa başladı*

**whereby**[1] ['weə'baı] *relat. adv* ...vasitəsilə, ...köməyilə, ...yolu ilə, ...üsulu ilə; *He devised a plan whereby he might escape O elə bir plan cızdı ki, onun köməyilə/vasitəsilə qaçıb qurtara bilsin; A law whereby all children are to receive cheap milk Elə bir qanun ki, onun köməyilə bütün uşaqlar ucuz süd ala bilsinlər*

**whereby**[2] ['weə'baı] *interrog. adv* necə? nə təhər? hansı vasitə ilə? hansı yolla?; *Whereby shall we know him? Biz onu necə/nə təhər tanıyacağıq?*

**wherefore**[1] ['weə'fɔ:^r] *n* səbəb; *Never mind the why(s) and the wherefore(s) Səbəbini heç soruşma/ soruşmayın*

**wherefore**[2] ['weə'fɔ:^r] *interrog. adv* 1. niyə? nəyə görə? nə üçün? *Wherefore did you go? Nə üçün sən/siz getdin/getdiniz?* 2. hansı məqsədlə? **the reason ~ we have met** görüşümüzün məqsədi

**wherein**[1] ['weər'ın] *rel. adv* harada, orada, hansında ki; **the room ~ he lay** onun uzandığı otaq; **a situation ~ it is hard to decide what is right and wrong** nəyin düz və nəyin səhv olduğu qərarına gəlməyin çətin olduğu vəziyyət

**wherein**[2] ['weər'ın] *interrog. adv* nədə? harada?; *Wherein am I mistaken? Mən nədə/harada səhv edirəm?*

**whereness** ['weənıs] *n* ...olduğu yer; tutduğu yer/məkan

**whereof** ['weər'ɔv] *adv* 1. nədən? hansından?; 2. kim/nə haqda; nə barədə; **the person ~ he speaks** onun haqqında danışdığı şəxs; *He knows whereof he speaks O, nə barədə danışdığını bilir*

**whereupon**[1] ['weərə'pɔn] *adv* nədə? harada?

**whereupon**[2] ['weərə'pɔn] *conj* bundan sonra, ...nəticəsində; onda; *I explained the matter, whereupon he laughed heartily Mən ona işin nə yerdə olduğunu izah etdim, bundan sonra o, ürəkdən güldü; One of the men insulted another, whereupon a fight broke out Adamlardan biri o birisini təhqir etdi, bunun nəticəsində də vuruş başladı*

**wherever**[1] ['weər'evə^r] *interrog. adv* 1. harada? *Wherever is he? O haradadır?* 2. hara? harada olsa; istədiyi yerdə; *Wherever are you going at this time of night? Gecənin bu vaxtı hara gedirsən?/ gedirsiniz? Sit wherever you like İstədiyin /İstədiyiniz yerdə otur/oturun; Sleep wherever you like! İstədiyin/ İstədiyiniz yerdə yat/yatın! Wherever you go, I go too Hara getsən/getsəniz, mən də gedəcəm;* 3. *Təəccüb bildirir:* haradan? *Wherever did you get that idea? Bu fikir sənin/sizin haradan ağlına/ağlınıza gəldi?*

**wherever**[2] ['weər'evə^r] *conj* 1. harda olursa olsun, hər yanda/yerdə; *Wherever he is, he always does well O harada olursa olsun, həmişə özünü yaxşı göstərir; I'll find him wherever he is O harada olursa olsun, mən onu tapacağam;* 2. mümkün olan bütün hallarda; imkan daxilində; *Wherever possible the jobs are given to local people Mümkün olan bütün hallarda /imkan daxilində iş yerli adamlara verilir*

**wherewith** [weə'wıθ] *relat. adv arx.* nə ilə, nəyin köməyi ilə; *I haven't the money wherewith to pay them Mənim pulum yoxdur ki, onlarla haqq-hesab üzəm*

**wherewithal** ['weəwıðɔ:l] *n* **(the ~)** *d.d.* pul, lazımi vəsait; *I should like to buy a new car but haven't got the wherewithal Mən təzə maşın almaq istərdim, lakin lazımi qədər vəsaitim/pulum yoxdur; I haven't the wherewithal to continue my education Təhsilimi davam etdirmək üçün mənim lazımi pulum/ vəsaitim yoxdur*

**wherry** ['werı] *n* qayıq, yalik *(iki və dörd avarlı qayıq)*; barja; barka *(yük daşımaq üçün yastıdibli palubasız böyük çay gəmisi)*

**whet**[1] [wet] *n* 1. itiləmə *(ülgücü və s.)*; 2. qıcıqlanma, şiddətlənmə; törətmə, oyatma, oyandırma, artırma *(marağı, iştahanı və s.)*

**whet**[2] [wet] *v* 1. itiləmək *(ülgüc və s.)*; 2. şiddətləndirmək, keskinləşdirmək *(hissiyyatı və s.)*;

oyatmaq, oyandırmaq, artırmaq *(iştahanı, arzunu, marağı və s.); Magazines often publish short extracts from new novels to whet your appetite Jurnallar tez-tez təzə romanlardan qısa parçalar dərc edirlər ki, adamların marağını daha da artırsınlar*

**whether[1]** ['weðə˞] *interrog. pron. arx.* hansı? ikisindən biri; *Whether is heavier water or oil? Nə/Hansı ağırdır – su yoxsa yağ? Whether room do you prefer? Hansı otağı istərdin/istərdiniz? Put the wine into glasses whether you have Hansından varındırsa/varınızdırsa, stəkanlara şərab tök/tökün*

**whether[2]** ['weðə˞] *conj. (adət.* **~ ... or not; ~ ... or (~) to know, to consider, to doubt, to question, to wonder** *və s. fellərin tamamlığı kimi işlənir: vasitəli sualları başlayır:* **-ıb, -ib, -ub, -üb** və **-diyini/-dığını** *şəkilçiləri işlətməklə* **yaxud, ya, yoxsa** *bağlayıcısı vasitəsilə ifadə olunur: I don't know whether he is here Mən onun burada olub-olmadığını bilmirəm; We were wondering whether to go today or tomorrow Biz bu günmü ya sabahmı gedəcəyimizi bilmək istəyirdik; He asked whether he could help O, onun kömək edib-etməyəcəyini soruşdu;* **1)** *Əgər* **or** *ilə ayrılan iki alternativ budaq cümlə varsa, onda* **"whether"** *hər ikisində təkrar edilir: I asked him whether he had done it all himself or whether someone had helped him Mən ondan soruşdum ki, bunu o özü təkmi edib yoxsa ona kimsə kömək edib;* **2)** *Sifət və sözönlərindən sonra şübhə, inamsızlıq və s. bildirən alternativ budaq cümlələrlə işlənir: It was not clear whether the riots were political or religious Aydın deyildi ki, iğtişaşlar siyasi, yoxsa dini xarakter daşıyır; She was undecided whether she should accept his offer O qəti bir qərara gələ bilmirdi ki, onun təklifini qəbul etsin ya yox; He is in doubt whether he should wait O bilmirdi ki, gözləsin ya yox; I am not interested in whether you approve of it or not Mən maraqlanmıram ki, sən/siz onu bəyənirsən/bəyənirsiniz ya yox; I am not informed as to whether he did the work Mənə məlumat verilməyib ki/deyilməyib ki, o bu işi edib ya yox; It all depends on whether it rains or not Hər şey yağışın yağıb-yağmamasından asılıdır;* **3)** *Şərt-güzəşt budaq cümləsi yaxud tərkibilə işlənir;* **...-sa, ...-sə, ya, ya yox**; *Whether he comes or not, we shall leave O gəlsə də, gəlməsə də biz çıxıb gedəcəyik; I shall go whether it is fine or not Hava yaxşı da olsa, pis də mən gedəcəyəm; This is what I think, whether right or wrong Düzdür ya səhvdir, mənim fikrim belədir/mən belə düşünürəm*

**whetstone** ['wetstoun] *n* bülöv, bülöv daşı;

◊ **to lie for the ~** vicdansız yalançı olmaq

**whew[1]** [hw(j)u:] *n* fit, fıştırıq; fit səsi; vıyıltı, vızıltı *(güllə səsi)*

**whew[2]** [hw(j)u:] *v* fit fermək, fıştırıq çalmaq

**whey** [weı] *n* zərdab, serum

**whey-faced** ['weıfeıst] *adj* bənizi qaçmış/solmuş, rəngi ağarmış *(xüs. qorxudan)*

**which[1]** [wıtʃ] *adj Vasitəsiz suallarla işlənir:* hansı? *Which way is the wind? Küləyin istiqaməti hansı yanadır? Which book did you choose? Sən/Siz hansı kitabı seçmisən?/seçmisiniz? Which boy won the prize? Hansı oğlan priz aldı? Say which chapter you prefer? De/Deyin hansı fəsil sənin/sizin xoşuna /xoşunuza gəlir?*

**which[2]** [wıtʃ] *interrog. pron. Müəyyən miqdar adam və ya şey içərisindən seçmək məqsədilə işlənir:* hansı? kimə? *Which of you am I to thank? Mən hansınıza öz təşəkkürümü bildirməliyəm? Which way shall we go? Biz hansı yolla gedəcəyik? Which Mr. Smith do you mean – the one who teaches history or music? Hansı cənab Smiti nəzərdə tutursan/tutursunuz – tarixdən, yoxsa musiqidən dərs deyəni? Which languages do you study at school? Məktəbdə hansı dilləri öyrənirsən /öyrənirsiniz?*

◊ **~ is ~** hansı ... hansıdır? *They are so alike I can never tell which is which Onlar elə bir-birinə oxşayırlar ki, onlardan hansının hansı olduğunu fərqləndirə bilmirəm*

**which[3]** [wıtʃ] *rel. pron.* **1.** *Budaq cümləni baş cümləyə bağlayır və baş cümlədəki ismi budaq cümlədə əvəz edir: Azərbaycan dilinə tərcümə edilmir:* hansı ki, hansılar ki; *The river which flows through London is called the Thames Londondan axan çay Temza adlanır; Houses which overlook the lake cost more Gölə baxan evlər daha qiymətlidir; The best film which won several awards, was about the life of Gandhi Bir neçə dəfə mükafat almış ən yaxşı film Qandinin həyatı haqqındadır;* **2.** əslində; *He looked like a retired general, which indeed he was O, istefada olan generala oxşayırdı, əslində elə belə də idi;* **3.** *Budaq cümlənin mübtədası kimi işlənir; Azərbaycan dilinə tərcümə olunmur. Bu halda mürəkkəb cümlə dilimizə iki sadə cümlə vasitəsilə tərcümə edilir:* hansı ki; *He lost his way, which delayed him considerably O, yolunu azdı, bu da onu xeyli gecikdirdi; He said he saw me there, which was a lie O dedi ki, o məni orada görüb, bu, yalan idi; It is raining hard, which prevents me from going out Bərk yağış yağır, o da mənə bayıra çıxmağa mane olur; He demands that actors should have talent, in which he is right O tələb edir ki, aktyorların istedadı olmalıdır, bunda o, haqlıdır*

**which[4]** [wıtʃ] *conj Vasitəli suallarda və budaq cümlələrdə işlənir:* nə; hansı; kim; *Will you advise me which to take? Mənə hansını götürməyi məsləhət edərsənmi/edərsinizmi? Of these two I do not know which to prefer Bu ikisindən bilmirəm, hansına üstünlük verim; I don't know which way we must take Bizim hansı yolla*



*getməli olduğumuzu (mən) bilmirəm; Which car is yours – the Ford or the Volvo? Hansı maşın səninkidir/ sizinkidir – Ford yoxsa Volvo? Which colour do you want, red or blue? Hansı rəngi istəyirsən/ istəyirsiniz, qırmızı yoxsa mavi?*

**whichever** [wıtʃ'evə˞] *rel. pron.* **1.** hansı; *Take whichever hat suits you best Hansı şlyapa sənə/sizə ən çox yaraşırsa, onu da götür/götürün; We'll eat at whichever restaurant is cheaper Hansı restoran daha ucuzdursa, biz orada da yeyəcəyik; Whichever of you comes first, will receive a prize Sizdən kim birinci gəlsə, o da priz alacaq;* **2.** hansı olursa olsun, fərqi yoxdur; *It takes three hours, whichever route you take Fərqi yoxdur hansı marşrutu seçirsənsə/ seçirsinizsə, seç/seçin, düz üç saat vaxt aparacaq; Whichever desk he chooses, they won't be pleased Hansı stolu seçirsə seçsin, fərqi yoxdur, onlar razı qalmayacaqlar*

**whiff[1]** [wıf] *n* I **1.** xəfif hava axını, əsmə; axın; cərəyan; **a ~ of fresh air** təmiz hava axını; **2.** zəif iy/qoxu *(adət. xoşagəlməz)*; **the ~ of a cigar** zəif siqar iyi/qoxusu; **a ~ of garlic** sarımsaq iyi; *Something good must be cooking, I got /caught a whiff of it through the window Deyəsən nə isə yaxşı bir şey bişirilir, məni pəncərədən onun iyi/qoxusu vurdu; He caught a whiff of perfume as he leaned towards her O ona tərəf əyiləndə onu xəfif bir ətir iyi vurdu;* **3.** qısa siqar; **4.** tüstü, zəif/yüngülvarı tüstü; **5.** vıyıltı *(külək/güllə səsi)*

**whiff** [wıf] *n* II yastı balıq *(kambala balığının ümumi adı)*

**whiff[2]** [wıf] *v* **1.** əsmək, zəif əsmək; **2.** tüstü burumları buraxmaq *(papiros çəkərkən)*; pis hiss etmək/bilmək, qoxu bilmək; **3. (to ~ away/off)** vıyıldamaq *(güllə, külək və s.)*; külək kimi aparmaq; yelləmək, yelləndirmək, dalğalandırmaq; üfürmək

**whiffet** ['wıfıt] *n amer. d.d.* **1.** tüstüciyəz; **2.** itciyəz; **3.** *kin.* küçük *(adam haq.)*; vecsiz adam

**whiffle[1]** [wıfl] *n* ani şiddət *(külək haq.)*; axın, cərəyan *(hava haq.)*

**whiffle[2]** [wıfl] *v* **1.** zəif əsmək *(külək)*; **2.** yelləmək; yelləndirmək, dalğalandırmaq; **3.** fit vermək/ çalmaq; **4.** *amer.* tərəddüd etmək; boyun qaçırmaq, qətiyyətsizlik göstərmək

**whiffler** ['wıflə˞] *n* **1.** səbatsız/mütərəddid/ dəyişkən adam; hərdəmxəyal/ yelbeyin adam; **2.** lovğa/özünü öyən/təkəbbürlü adam; **3.** yararsız/vecsiz/ ləyaqətsiz adam

**while[1]** [waıl] *n* **1.** vaxt, müddət, ərz; *Where have you been all this while? Bu müddət ərzində harada olmusan? /olmusunuz?;* **a long/a short ~** uzun/qısa bir müddət /vaxt; *I haven't seen him for a long/for a short while Mən onu uzun/qısa müddətdir ki, görməmişəm;* **in a little ~** tezliklə; **a ~ ago** bir az bundan əvvəl, lap indicə; **a long ~ ago** çoxdan; **at ~s** hərdənbir, bəzən; **once in a ~** hərdənbir, vaxtaşırı; **quite a ~** *d.d.* kifayət qədər gec; *We must rest a while Biz bir azca dincəlməliyik / istirahət etməliyik;* **this long ~ past** bütün bu uzun müddət ərzində; **2. (the ~)** *şair.* bütün vaxt ərzində; *He sang to her and looked in her eyes the while O onun üçün mahnı oxudu və bütün vaxt ərzində onun gözlərinin içinə baxdı, O bütün vaxt ərzində onun gözlərinin içinə baxaraq onun üçün mahnı oxuyurdu;* **for a ~** bir müddətə, az bir müddətə/ vaxta; **for a good ~** uzun bir müddətə; **in a little ~** tezliklə

**while[2]** [waıl] *v* **1.** vaxt keçirmək; **2.** yayındırmaq, daşındırmaq, uzaqlaşdırmaq; **to ~ sorrow** qəmdən/ dərddən uzaqlaşmaq/fikrini yayındırmaq/dərdi özündən qovalamaq; **to ~ away** boş-bikar gəzmək; **to ~ away the time** vaxt keçirmək; *We whiled away the time at the airport reading magazines Biz aeroportda vaxtımızı jurnal oxumaqla keçirdik; It's easy to while a few hours away in a museum Muzeydə bir neçə saat vaxt keçirmək asandır*

**while[3]** [waıl] *conj* **1.** -kən, ikən; *While in London, he studied music Londonda olarkən, o, musiqi ilə məşğul oldu; He was drowned while bathing Çimərkən o batdı; She wrote her first novel while still at school O, ilk romanını hələ məktəbdə ikən yazdı; He fell asleep while (he was) watching television O, televizora baxarkən yuxuladı; While Mary was writing the letter, the children were playing outside Meri məktubu yazarkən, uşaqlar bayırda oynayırdılar;* **2.** nə qədər ki, ta ki; *While there is life there is hope Nə qədər ki, həyat mövcuddur, bir o qədər də ümid vardır;* **3.** baxmayaraq ki; *While I admit that the problems are difficult, I don't agree that they cannot be solved Baxmayaraq ki, mən problemlərin çətin olduğunu boynuma alıram, lakin onların həll oluna bilməyəcəyi fikri ilə razılaşmıram;* **4.** halbuki; *I was dressed in black while my friend was dressed in white Mən qara paltar geyinmişdim, halbuki mənim dostum ağ paltar geyinmişdi; I prefer black coffee while David prefers it with cream Mən tünd kofe içməyi üstün tuturam, halbuki David onu xama ilə içməyi üstün tutur/xoşlayır; Their country has plenty of oil, while ours has none Onların ölkəsinin çoxlu nefti var, halbuki bizimkində heç nə yoxdur*

**whim** [wım] *n* **1.** şıltaqlıq, qəribəlik, tühaflıq; ədabazlıq; **only a passing ~** ancaq keçici/ müvəqqəti şıltaqlıq; *It is an old man's whim Bu, qoca kişinin şıltaqlığıdır; Staff are moved from one department to another at the whim of the boss Sahibkarın ədabazlığı /şıltaqlığı ucbatından heyət bir şöbədən o biri şöbəyə köçürüldü; It's just something I bought on a whim Bax bu şeyi elə mən ədabazlıq ucbatından almışam;* **2.** dəmdəməkilik, dönüklük; səbatsızlıq

**whimper[1]** ['wımpə˞] *n* **1.** ağlama, sızlama, inləmə; **2.** ciyilti, cığ-bığ, zingilti *(kiçik səsi və s.)*

**whimper²** ['wımpəʳ] *v* **1.** ağlamaq, ağlayıb-sızıldamaq, sızlamaq, inləmək, cığ-vığ salmaq; *A child in a bed nearly began to whimper Yaxındakı çarpayıdan uşaq cığ-vığ salmağa/ağlamağa başladı; "For God's sake don't leave me alone", he whimpered "Allah xatirinə, məni yalqız buraxma/ buraxmayın" deyə o sızladı;* **2.** zingildəmək, ulamaq *(it haq.)*; **3.** vıyıldamaq *(külək)*; **4.** şırıldamaq, şırıltı ilə axmaq *(su haq.)*

**whimsical** ['wımzıkl] *adj* **1.** qəribə, əcaib; *He turned whimsical O, əcaib olub;* **a ~ sense of humour** qəribə yumor hissi; *Much of his work has a whimsical quality Onun işlərinin çoxunda tühaf/ qəribə bir keyfiyyət var;* **2.** şıltaq, ədabaz, tühaf; *He is whimsical in his ways O, tühaf bir adamdır, Onda qəribəlik vardır; He was a whimsical about the matter O bu məsələdə şıltaqlıq etməyə başladı*

**whimsicality** [,wımzı'kælıtı] *n* şıltaqlıq, tühaflıq; ədabazlıq, müşkülpəsəndlik

**whimsy** ['wımzı] *n* **1.** şıltaqlıq; əda; naz; kef; **2.** xəyal, xülya

**whine¹** [waın] *n* **1.** yazıq-yazıq ulama/zingildəmə; **to utter a ~** zingildəmək, zingildəməyə başlamaq *(it)*; **2.** *məc.* sızıltı, zarıma, ağlayıb-sızlama; *I wish you'd stop whining Mən istərdim ki, sən/siz zarımağı/ağlayıb-sızlamanı dayandırasan/ dayandırasınız;* **3.** vıyıldama, vızıldama *(güllə və s.)*; **the ~ of bullets** güllələrin vıyıltısı

**whine²** [waın] *v* **1.** ulamaq; zingildəmək; *The dog was whining outside the door İt qapının ağzında zingildəyirdi;* **2.** sızlamaq, ağlayıb-sızlamaq, zarımaq; zar-zar ağlamaq; *The child was whining inside the room Uşaq otaqda zar-zar ağlayırdı;* **3.** vıyıldamaq, səs-küy salmaq, vızıldamaq *(güllə, motor və s.)*

**whinger** ['wıŋəʳ] *n* xəncər, qısa qılınc

**whinny¹** ['wını] *n* alçaqdan kişnəmə

**whinny²** ['wını] *v* alçaqdan kişnəmək

**whip¹** [wıp] *n* **1.** qamçı, qırmanc; *He cracked his whip and the horse leapt forward O, qamçısını şaqqıldatdı və at irəliyə sıçradı; The jockey was fined for excessive use of the whip Qamçını həddən artıq işlətdiyinə görə jokey cərimələndi;* **2.** faytonçu, arabaçı; **to be a good/a poor ~** yaxşı /pis faytonçu olmaq; **3.** İngiltərə və ABŞ-da siyasi partiyanın rəsmi təşkilatçısı *(həm də* **party ~**); **4.** sırıqlama, ilməkləmə *(ilməyi və s.)*; **5.** külək dəyirmanının cinahı/pəri

**whip²** [wıp] *v* **(-pp-) 1.** qamçılamaq, qırmaclamaq; döyəcləmək; *Prisoners were whipped to get confessions out of them Günahlarını boyunlarına qoymaq üçün dustaqları qamçıladılar; The rain was whipping the windowpanes Yağış pəncərənin şüşələrini döyəcləyirdi;* **2.** qovmaq, bərk sürmək *(atı) (həm də* **~ up**); *The driver whipped the horses on Sürücü atları qovalayırdı/qamçılayırdı;* **3.** söymək, bərk tənqid etmək; **4.** tilovla balıq tutmaq; **5.** çalmaq *(yumurta, krem və s.)*; *He whipped egg with sour cream O, bir yumurta ilə xamanı çaldı;* **6.** məğlub etmək, üstün/qalib gəlmək, darmadağın etmək *(düşməni)*; hamını ötüb keçmək *(yarışda: rəqibi və s.)*; **7. 1)** toplamaq, qovalayıb bir yerə yığmaq *(ov itlərini)*; **2)** toplamaq, birləşdirmək *(adamları)*; **8.** cummaq, cəld hərəkət etmək, birdən cummaq/atılmaq; *I'm just going to whip across the road to the bank Mən bu saat cəld yolu keçib banka gedəcəyəm; She whipped off her shoes O cəld ayaqqabılarını çıxartdı; She suddenly whipped the mask from her face O birdən cəld maskanı üzündən çıxartdı;* **to ~ downstairs** pilləkənləri cəld aşağı düşmək; **9.** *d.d.* oğurlamaq; *Who's whipped my umbrella? Mənim çətirimi kim oğurlayıb?* **10.** çarx vasitəsilə yük qaldırmaq; **11.** bir şeyin balağını / qırağını/ucunu tikmək, sırıqlamaq, kök atmaq, ilgəkləmək; **12.** dalğalanmaq, yellənmək *(bayraq, yelkən və s.)*; *Flags were whipping in the wind Bayraqlar küləkdə dalğalanırdı;* **13.** *d.d.* içmək *(adət, spirtli içki)*; **14.** *siya.* parlament üzvünü iclasa çağırmaq; **to ~ away 1)** qaçmaq, götürülmək, daban almaq, dabanına tüpürmək; **2)** silahı qapıb götürmək; **3)** qapmaq *(sumka və s.)*; **to ~ in** toplamaq, bir yerə yığmaq; **to ~ off 1)** qəfildən dartmaq, birdən çəkib götürmək, qəfildən yığıb götürmək; *The thief whipped the jewels off the counter Oğru zinət şeylərini piştaxtadan qəfildən yığıb götürdü;* **2)** qaçmaq, çıxıb getmək, götürülmək; götürüb aparmaq/getmək; *The wind whipped several slates off the roof Külək damdan bir neçə şiferi götürüb apardı;* **3)** qamçı ilə qovalamaq; **to ~ on 1)** qamçılamaq, şallaqlamaq; **2)** kəskin/sərt demək; **to ~ out a reply** kəskin cavab qaytarmaq/vermək; **to ~ round** cəld dönmək; *She whipped round just as he was about to attack the girl from behind Arxadan o, qıza hücum etmək istəyəndə, o dərhal cəld geri döndü;* **to ~ up 1)** tələm-tələsik nəsə hazırlamaq; **2)** oyatmaq, alovlandırmaq, ehtizaza/riqqətə gətirmək; **to ~ up emotions** ehtirasları alovlandırmaq; *She tried to whip up some interest in the idea O bu fikrə müəyyən bir maraq oyatmağa çalışdı;* **3)** qapmaq, götürmək; dartıb götürmək *(silahı və s.)*; *The intruder whipped out a knife Çağırılmamış qonaq bıçağı qapıb götürdü;* **4)** toplamaq, cəlb etmək *(camaatı, dinləyiciləri)*;

◊ **to ~ into shape** *amer.* **1)** *d.d.* öyrətmək, adam eləmək; **2)** lazımi vəziyyətə salmaq

**whipcord** ['wıpkɔ:d] *n* **1.** ciyə, viş *(şallaq düzəltmək üçün)*; **2.** *toxuc.* qalın qabardin parça

**whip-hand** ['wıp'hænd] *n* **1.** qamçı tutan (sağ) əl; **2.** *məc.* hakimiyyət; üstünlük; **to have the ~ of/over smb.** bir kəsi tam itaətdə saxlamaq; *Don't let them do whatever they want; make sure you keep the whip-hand Onları istədiklərini etməyə qoyma/ qoymayın, əmin ol/olun ki, onlar sənin/sizin itaətin/itaətiniz altındadırlar*



**whip-handle** ['wıp,hændl] *n* **1.** qamçı dəstəyi; **2.** iri qamçı/şallaq

**whip-lash** ['wıplæʃ] *n* qamçının qayışı; şallaq ciyəsi / vişi; **to work under the ~** şallaq gücünə işləmək

**whipper-in** ['wıpər'ın] *n* **1.** *ovç.* tazıları idarə edən ovçu; **2.** ən axırda gələn at *(yarışda, cıdırda və s.)*

**whipper-snapper** ['wıpə,snæpəʳ] *n* yaramaz/heç bir şeyə yaramayan adam; ağzından süd iyi gələn adam/oğlancığaz; *Don't talk to me like that, you young whipper-snapper! Ay ağzından süd iyi gələn oğlancığaz, mənimlə belə danışma!*

**whippet** ['wıpıt] *n* tazı *(it növü)*

**whipping¹** ['wıpıŋ] *n* **1.** kötəkləmə, vurma, döymə, şallaqlama; qamçılama, qırmanclama; **2.** qırağını/ ətəyini köklənmə/tikmə *(tor və s. ilə)*; **3.** *top.* **i** qayış, şallaq, qırmanc; **4.** *tex.* əyilmiş/qırılmış yer; əyilmə, sallanma

**whipping²** ['wıpıŋ] *adj* **1.** cəld, tez, iti, yeyin; sürətli; zirək, çevik, diribaş; **2.** qamçı ilə/qırmancla döyən

**whipping-boy** ['wıpıŋbɔı] *n* qapazaltı, taplələ

**whipping-top** ['wıpıŋtɔp] *n* fırfıra, fırlanğıc

**whip-poor-will** ['wıppuə,wıl] *n zool.* çobanaldadan *(quş)*

**whippy** ['wıpı] *adj* elastik, elastiki, asanlıqla əyilə bilən

**whip-saw¹** ['wıpsɔ:] *n* yayşəkilli əl mişarı/bıçqısı

**whip-saw²** ['wıpsɔ:] *v* yayşəkilli əl mişarı ilə mişarlamaq

**whipster** ['wıpstəʳ] *n kin.* heç bir rolu/əhəmiyyəti olmayan adam; uşaq, körpə, ağzından süd iyi gələn *(təcrübəsiz mənasında)*

**whir** [wə:] *n, v* = **whirr¹, ²**

**whirl¹** [wə:l] *n* **1.** fırlanma, hərlənmə, dolanma, dövrə vurma; **the ~ of the propeller blades** propeller pərlərinin fırlanması; **2.** burulğan, burağan; **a ~ of dust** toz burulğanı; **3.** vurhavur, mərəkə, qarışıqlıq, çaxnaşma; **an endless ~ of parties** partiyaların aramsız vurhavuru/çaxnaşması; **to be thrust into the social ~** ictimai çaxnaşmaya qarışmaq/özünü soxmaq; **4.** təlaş, təşviş; *His brain was in a whirl O, fikirlərini cəmləşdirə bilmirdi (təlaş və s. nəticəsində); My mind is in a complete whirl Mən tamam başımı itirmişəm, Mən tamamilə çaş-baş qalmışam*

**whirl²** [wə:l] *v* **1.** fırlanmaq, hərlənmək, dolanmaq, dövrə vurmaq; *The leaves were whirling in the wind Yarpaqlar küləkdə fırlanırdı; The dancers whirled around the floor Rəqqasələr döşəmədə dövrə vurdular;* **2.** sürətlə ötüb keçmək; *The car whirled out of sight Maşın sürətlə ötüb gözdən itdi; The houses whirled past us as the train gathered speed Qatar sürətini artırdıqca evlər sürətlə gözlərimiz önündən ötüb keçirdi;* **3.** fırlanmaq, gicəllənmək *(baş)*; təlaşlı/təşvişli olmaq; təlaş hissi keçirmək; *I couldn't sleep; my mind was still whirling from all I had seen and heard Mən yata bilmədim; bütün gördüklərimdən və eşitdiklərimdən başım gicəllənirdi;* **to ~ away 1)** aparmaq *(külək, sel)*; *They were whirled away in a car Maşın onları sürətlə götürüb getdi;* **2)** qasırğa kimi keçmək, dövrə vurub ötmək, hərlənərək götürüb getmək

**whirlabout** ['wə:ləbaut] *n* **1.** fırlanma, hərlənmə; dövr etmə; **the ~ of history** tarixin dövr etməsi; **2.** fırfıra

**whirligig¹** ['wə:lıgıg] *n* **1.** fırfıra, fırlanğıc; **2.** karusel; **3.** girdab, burulğan *(hadisə və s.)*; **4.** tez dəyişmə *(təəssürat və s.)*; **the ~ of time** bəxtin/taleyin dönüklüyü

**whirligig²** ['wə:lıgıg] *v* hərlənmək, fırlanmaq, dolanmaq

**whirlpool** ['wə:lpu:l] *n* girdab, burulğan, qıjov *(su burulğanı)*; **to be sucked into the ~** burulğana düşmək

**whirlwind¹** ['wə:lwınd] *n* **1.** qasırğa, burulğan; *The school was seriously damaged by a whirlwind Məktəb binası qasırğadan ciddi zədələnmişdi;* **2.** *məc.* alovluluq, atəşlilik, çılğınlıq; **~ of passion** ehtirasın çılğınlığı;

◊ **to ride the ~** öhdəsindən gəlmək *(bir şeyin)*, çətin vəziyyətdə təmkinli olmaq

**whirlwind²** ['wə:lwınd] *adj* **1.** qasırğalı, burulğanlı, tufanlı; **2.** alovlu, atəşin, çılğın; **a ~ of applause** atəşin/ alovlu alqışlar

**whirr¹** [wə:ʳ] *n* **1.** səs, səs-küy *(maşının və s.)*; **the ~ of the sewing machine** tikiş maşınının səsi; **the ~ of a car** maşının səsi/səs-küyü; **2.** vızıltı, vızıldama; **the ~ of a fly** milçəyin vızıltısı

**whirr²** [wə:ʳ] *v* **1.** səs/səs-küy salmaq *(təkər, maşın və s.)*; **~ing helicopters** səs-küy salan vertolyotlar; *The coffee machine made a series of whirring and clicking sounds Kofe/Qəhvə maşını bir qədər səs saldı və şaqqıldadı;* **2.** səs-küylə ötüb keçmək, vıyıltı ilə/sürətlə ötüb keçmək; *A bird whirred past Quş sürətlə ötüb keçdi;* **3.** vızıldamaq

**whisk¹** [wısk] *n* **1.** süpürgəcik, kiçik süpürgə, kiçicik şotka *(paltarın tozunu təmizləmək və s. üçün)*; **2.** yumurta və s. çalmaq üçün ucu yaylı alət; **3.** qısa cəld hərəkət; *The horse brushed off the flies with a whisk of its tail At quyruğunun cəld hərəkəti ilə milçəkləri qovdu*

**whisk²** [wısk] *v* **1.** qovmaq *(bir şeylə) (həm də* **to ~ away/off) to ~ the flies off** milçəkləri qovalamaq *(milçəkqovanla)*; **2.** çalmaq *(yumurtanı, kremi və s.)*; **3.** tez/cəld götürüb getmək, birdən götürüb getmək/aparmaq; *The waiter whisked away the plates before we had finished Biz (yeməyi) qurtarmamış ofisiant nimçələri tez götürüb getdi; They whisked the man off to prison Onlar kişini tez götürüb həbsxanaya*

*apardılar*; 4. tez/cəld uzaqlaşmaq, birdən yox olmaq *(həm də* **to ~ out**); *The mouse whisked into its hole Siçan tez deşiyinə girib yox oldu; He whisked off before I could speak to him Mən onunla danışmağa macal tapmamış o, yox olub getdi*; 5. bulamaq, arabir yellətmək *(quyruğu və s.)*; *The cow whisked her tail İnək quyruğunu buladı; He went whisking a cane O, əl ağacını yelləyə-yelləyə getdi*

**whisker** [ˈwıskəʳ] *n (adət. pl)* 1. bakenbard *(çənənin altı qırxılaraq yanaqlarda saxlanılan saqqal)*; **wearing a wig and false ~s** parik və saxta bakenbardlar qoyma/saxlama; 2. bığ *(pişikdə, pələngdə və s.)*; 3. *pl arx.* bığ; saqqal; sifətdə tüklər;
◊ **to be the cat's ~s** *sl* yaxşı/ gözəl adam olmaq; *He thinks he's the cat's whiskers O elə bilir ki, ondan gözəl/yaxşı adam yoxdur*; **by a ~** azacıq/ kiçicik üstünlüklə; *She won the race by a whisker O, qaçış yarışını azacıq üstünlüklə uddu*

**whisky** [ˈwıskı] *n* viski *(ABŞ və İrlandiyada)*

**whisky sour** [ˈwıskı.sauə] *n* kokteyl növü

**whisper¹** [ˈwıspəʳ] *n* 1. pıçıltı; **to speak in a ~** pıçıltı ilə danışmaq; *Her voice dropped to a whisper Onun səsi pıçıltıya keçdi*; 2. şayiə, danışıq, söz-söhbət, qeybət; *It is whispered that he is heavily in debt Belə söz-söhbət gəzir ki, o çoxlu borc içindədir*; **to give the ~** *d.d.* işarə etmək, eyham vurmaq, söz atmaq; 3. xışıltı *(yarpağın və s.)*

**whisper²** [ˈwıspəʳ] *v* 1. pıçıldamaq, pıçıltı ilə danışmaq; pıçıldaşmaq; *He leaned over and whispered something in the girl's ear O əyildi və qızın qulağına nə isə pıçıldadı; She whispered (to me) that she was afraid O mənə pıçıltı ilə dedi ki, o qorxur; The children were whispering in the corner Uşaqlar küncdə pıçıldaşırdılar*; 2. gizlicə şayiə/ xəbər/ məlumat yayılmaq; *It's whispering that he may resign Belə şayiə gəzir ki, o, istefaya gedə bilər*; 3. xışıldamaq

**whisperer** [ˈwıspərəʳ] *n* xəbərçi/şayiə yayan adam

**whispering** [ˈwıspərıŋ] *n* 1. pıçıltı, pıçıltı ilə danışma; 2. şayiə, xəbər, danışıq, söz-söhbət

**whispering campaign** [ˈwıspərıŋkæmˈpeın] *n* öz rəqibi haqqında yalançı şayiələr yayma

**whisperous** [ˈwıspərəs] *adj* pıçıltılı, pıçıltıya oxşayan

**whist** [ˈwıst] *n* vist *(kart oyunu)*

**whistle¹** [ˈwısl] *n* 1. fit, fıştırıq; fıştırıq səsi; muşquruq, muşqurtu; *We heard the whistle of the steam-engine Biz parovozun fit səsini eşitdik; Bob gave a long low whistle Bob alçaq uzun fit səsi verdi*; 2. fit; **penny ~, tin ~** fit çalan oyuncaq; 3. *d.d.* boğaz; udlaq, hülqum; **to wet *one's* ~** boğazını yaşlamaq/islatmaq, içmək;
◊ **at *smb.*'s ~** ilk çağırışdan; ≅ bir fitə bənd olma; **to pay for *one's* ~** öz şıltaqlığı ucbatından çox şey itirmək

**whistle²** [ˈwısl] *v* 1. fit/fıştırıq çalmaq, fit/fıştırıq vermək; *She whistled to her dog and it came running O, itinə fit verdi və it qaça-qaça gəldi; The referee whistled and the game began Hakim fit verdi/çaldı və oyun başladı*; **to ~ for a taxi** fitlə taksi çağırmaq; 2. fitlə mahnı oxumaq, fitlə zümzümə etmək; **to ~ a tune** fitlə hava çalmaq/ zümzümə etmək; 3. vıyıldamaq, vızıldamaq *(güllə, külək)*; *The wind whistled up the chimney Külək bacada vıyıldayırdı; A bullet whistled past him Bir güllə vıyıltı ilə onun yanından keçdi*; 4. *amer. d.d.* bihudə/əbəs yerə bir şeyə nail olmağa çalışmaq; *He did a sloppy job so he can whistle for his money O, başdansovdu iş gördü, o, əlini puldan üzə bilər*; **to ~ away** 1) fitlə hava çalmaq; 2) əl çəkmək; hesaba/nəzərə almamaq; *Historical facts cannot be whistled away Tarixi faktları nəzərə almamaq olmaz*; **to ~ up** çağırmaq; **to ~ off** can qurtarmaq *(bir kəsdən)*, başdan eləmək *(bir kəsi)*; **to ~ *smb.* off** bir kəsdən can qurtarmaq; bir kəsi başdan eləmək;
◊ **to ~ for a (the) wind** ≅ boş/əbəs yerə gözləmək; **to ~ in the dark** 1) fit çalaraq özünü ruhlandırmaq, fit çalaraq özünə ürək-dirək vermək; 2) özünü təmkinli aparmaq, öz həyəcanını/qorxusunu büruzə verməmək; **to bid/to tell/to let *smb.* go ~** bir kəsə kobud rədd cavabı vermək, bir kəsi vecinə almamaq

**whistler** [ˈwısləʳ] *n jarq.* xəbərçi, donosçu, çuğulçu

**whistling¹** [ˈwıslıŋ] *n* fit, fıştırıq

**whistling²** [ˈwıslıŋ] *adj* fit/ fıştırıq çalan, fit/fıştırıq verən

**whistle stop** [ˈwıslstɔp] *n amer. d.d.* 1. yarımstansiya *(kiçik dəmiryol stansiyası)*; 2. seçicilərlə görüş üçün bir sıra yerlərdə qısa müddət dayanma *(seçki kampaniyası dövründə)*; **to be/to go on a ~ tour of the country** seçicilərlə görüş üçün ölkənin bir sıra yerlərinə qısa müddətli səyahət etmək

**whit** [wıt] *n* I zərrə, damcı; azacıq; *He is not a /no whit better O azacıq da olsa/zərrə qədər belə yaxşı deyil*

**Whit** [wıt] *adj din.*: **~ Monday** ruhlar günü; **~ Sunday** Troitsa günü *(xristian dini günü)*

**white¹** [waıt] *n* 1. ağ rəng; ağlıq; **dressed in ~** ağ paltar geymiş; 2. ağ boyaq/rəng; 3. ağ material *(parça)*; 4. yumurta ağı; *Take the whites of two eggs İki yumurtanın ağını götür/götürün; There is too much white of egg in this mixture Bu qatışıqda yumurta ağı lap çoxdur*; 5. gözün ağ pərdəsi, göz ağı *(həm də* **~ of the eye**); **to turn up the ~s of *one's* eyes** gözlərini ağartmaq; 6. ağ adam, ağ dərili adam; **three Negroes and two ~s** üç zənci və iki ağ adam; 7. *poliqr.* boş yer, ara; boşluq; məsafə, boş buraxılmış yer; 8. *bot.* üst oduncaq, oduncağın üst qatı; 9. ağ ət *(toyuqda və s.)*; 10. *şahm.* 1) ağ fiqurlar; 2) ağ fiqurlarla oynayan oyunçu; 11. *pl k.t.* ağ unun əla növü; 12. paklıq, təmizlik;



◊ **to call ~ black, to turn ~ into black** ağa qara, qaraya ağ demək

**white²** [waıt] *adj* 1. ağ; **~ wall/teeth /blossom /bread** ağ divar/dişlər/çiçək/çörək; *She painted the walls white O, divarları ağ rənglədi*; 2. solmuş, solğun, rəngi qaçmış; *Her face was white with fear Onun sifəti qorxudan ağarmışdı*; 3. ağ, çal; *His hair has turned white Onun saçı ağarıb /çallaşıb*; 4. şəffaf, rəngsiz *(su, hava, işıq haq.)*; 5. təmiz, müqəddəs, pak, ləkəsiz; 6. zərərsiz, ziyansız, qərəzsiz; **~ lie** qərəzsiz yalan; **~ war** iqtisadi /qansız müharibə; 7. *d.d.* düz, təmiz, alicənab, namuslu; **a ~ man** namuslu /düz adam; **~ propaganda** düz/açıq təbliğat; 8. ağ, ağ dərili; **three Negroes and two ~s** üç zənci və iki ağ (dərili) adam; **~ schools** ağ dərili uşaqlar üçün məktəblər;
◊ **~ feather** 1) qorxaqlıq; 2) qorxaq, ağciyər *(adam)*; **to show the ~ feather** qorxmaq; qorxaqlıq göstərmək; **~ night** yuxusuz gecə; **~ as death** ölü kimi ağappaq; **as ~ as a sheet** kağız kimi ağ; **to bleed ~** 1) qansızlaşdırmaq; gücdən salmaq; 2) *məc.* soymaq, var-yoxunu əlindən almaq; **~ fury** qəzəb, hiddət, qeyz, acıq *(həm də* **~ heat**); **~ light** 1) gündüz işığı; 2) qərəzsiz mühakimə; **to stand in a ~ sheet** hamı qarşısında öz səhvini/günahını etiraf etmək/ boynuna almaq; **~ crow** əcaib adam; **~ squall** birdən/qəfildən qopan şiddətli qasırğa/boran *(tropik ölkələrdə)*

**whitebait** [ˈwaıtbeıt] *n zool.* balıq balası, kürüdən təzəcə çıxmış körpə balıq

**white-book** [ˈwaıtˈbuk] *n* ağ kitab *(rəsmi sənədlər məcmuəsi)*

**white-coal** [ˈwaıtˈkoul] *n məc.* ağ kömür, su enerjisi

**white-collar** [ˈwaıtˈkɔləʳ] *adj d.d.* kontor; **~ job** kontor işi; **~ worker** kontor işçisi

**white-fish** [ˈwaıtfıʃ] *n zool.* ala balıq

**white-frost** [ˈwaıtfrɔst] *n* qırov

**white guard** [ˈwaıtga:d] *n* ağqvardiyaçı

**Whitehall** [ˈwaıtˈhɔ:l] *n* 1. Uaythol *(Londonda dövlət müəssisələrinin yerləşdiyi küçə)*; 2. *məc.* ingilis hökuməti

**white-handed** [ˈwaıtˈhændıd] *adj* namuslu, vicdanlı, təmiz, ləkəsiz

**white-headed** [ˈwaıtˈhedıd] *adj* 1. çal, ağsaçlı; 2. sarışın, açıq rəngli *(saç haq.)*; 3. köpüklü, ağ köpüklə örtülmüş *(dəniz haq.)*

**white horses** [ˈwaıtˈhɔ:sız] *n məc.* köpüklü dalğalar *(dənizdə)*

**white-hot** [ˈwaıtˈhɔt] *adj* 1. bərk közərdilmiş/ qızdırılmış; bərk qızmış/közərmiş; 2. çox möhkəm, çox sərt/coşğun; **~ conviction** çox sərt /ciddi ittiham; **~ passion** coşğun ehtiras; 3. *məc.* bərk qəzəblənmiş/ qeyzlənmiş/cinlənmiş/cin atına minmiş

**White-House, the** [ˈwaıtˈhaus] *n* 1. Ağ Ev *(ABŞ prezidentinin iqamətgahı)*; 2. *məc.* ABŞ hökuməti

**white-lime** [ˈwaıtˈlaım] *n* əhəng məhlulu

**white-lipped** [ˈwaıtlıpt] *adj* solğun dodaqlı; **~ with fright** qorxudan dodaqları ağarmış/dodaqlarının rəngi qaçmış

**white-livered** [ˈwaıt.lıvəd] *adj* qorxaq, aciz, ağciyər

**white-meat** [ˈwaıtmi:t] *n* ağ ət *(toyuqda, donada və s.)*

**whiten** [ˈwaıtn] *v* 1. ağartmaq; ağarmaq, təmizləmək; tər-təmiz etmək; *I must whiten my tennis shoes Mən tennis ayaqqabılarımı təmizləməliyəm*; 2. solmaq, saralmaq; rəngi /bənizi qaçmaq; 3. *məc.* təmizə çıxartmaq, üzünü ağ etmək, bəraət qazandırmaq

**whiteness** [ˈwaıtnıs] *n* 1. ağlıq; ağ rəng; **the pure ~ of her skin** onun dərisinin təmiz ağlığı; 2. təmizlik; saflıq, ləkəsizlik; **the clinical ~ of the room** otağın klinik təmizliyi

**whitening** [ˈwaıtnıŋ] *n* 1. təmizləyici maddə; 2. ağartma

**white paper** [ˈwaıtˈpeıpəʳ] *n* "ağ nəşr" *(ingilis rəsmi nəşri)*

**whitesmith** [ˈwaıtsmıθ] *n* tənəkəçi, qalayçı

**whitethorn** [ˈwaıtθɔ:n] *n bot.* yemişan

**white-tie** [ˈwaıˈtaı] *n* 1. ağ qalstuk *(frakla geyilən)*; **dressed in ~ and tails** ağ qalstuk və frak geyinmiş; 2. *məc.* frak;
◊ **a ~ dinner** təntənəli nahar

**white-throat** [ˈwaıtθrout] *n zool.* silviya quşu

**whitewash¹** [ˈwaıtwɔʃ] *n* 1. əhəng məhlulu *(divarı ağartmaq üçün)*; 2. ağartma; 3. bir kəsin qüsurlarını /səhvini/pis hərəkətlərini ört-basdır etmə; *The report was simply a whitewash Məruzə sadəcə olaraq ört-basdır demək idi*; 4. təmizə çıxma, bəraət qazandırma, təmiz adını/hüququnu bərpa etmə

**whitewash²** [ˈwaıtwɔʃ] *v* 1. ağartmaq, əhəngləmək; 2. bir kəsi təmizə çıxartmağa çalışmaq, qüsurları ört-basdır etmək; *The report attempts to whitewash recent events, but we all know the minister was seriously at fault Məruzə son hadisələri ört-basdır etməyə çalışır, lakin biz hamımız bilirik ki, nazir çox ciddi surətdə günahkardır*; 3. *amer. id.* "quru" *(uduş haq.)*

**white whale** [ˈwaıtˈweıl] *n zool.* ağ balıq *(qütb delfini)*

**whiting** [ˈwaıtıŋ] *n* I tabaşir *(ağartmaq üçün)*; əhəng məhlulu

**whiting** [ˈwaıtıŋ] *n* II *zool.* merlan balığı

**whitish** [ˈwaıtıʃ] *adj* ağımtıl, ağımsov, ağtəhər

**whitlow** [ˈwıtlou] *n tıb.* dolama

**Whitsunday** [ˈwıtˈsʌndı] *n din.* Troitsa günü

**Whitsuntide** [ˈwıtsntaıd] *n din.* Troitsa günündən sonrakı həftə *(xüs. ilk iş günü: Troitsa və ruhlar günü bayramı)*

**whittle** [ˈwıtl] *v* 1. bıçaqla ağacın qabığını yonmaq/ hamarlamaq; **to ~ at *smth.*** bir şeyin qabığını soymaq; **to ~ a pencil** karandaşı yonmaq;

2. bıçaqla kəsmək *(ağacı)*; **to ~ away** 1) yonmaq, hamarlamaq, hamar etmək, qıraqlarını kəsib atmaq; 2) *məc.* yox/tar-mar etmək; azaltmaq; *Bad financial management has whittled away the company's profits Pis rəhbərlik kompaniyanın gəlirlərini yox etdi/azaltdı; We've whittled down the list of candidates to five Biz namizədlərin siyahısını beşə endirdik*; **to ~ away a fortune** var-dövləti tar-mar etmək; **to ~ down** azaltmaq, yumşaltmaq; **to ~ down expenses/salaries/the cost** xərcləri /maaşları /dəyəri azaltmaq; **to ~ down a statement** bəyanatı yumşaltmaq; **to ~ off** yonmaq, rəndələmək

**whity-** [ˈwaɪtɪ-] *adj* açıq, ağımtıl *(mürəkkəb sözlərdə)*; **~ brown** açıq qəhvəyi

**whizz¹** [wɪz] *n* **1.** vıyıltı, fit; vızıltı *(güllə, ox və s. səsi)*; **~ of bullets** güllə vıyıltısı/vızıltısı; **to go with a ~** vıyıltı ilə ötüb keçmək; **2.** *amer. sl.* qoçaq/mahir adam, ustad; *He is a whizz at football O, futbol ustasıdır, O, futbolu əla oynayır; She is a whizz at maths O, riyaziyyatın mahir bilicisidir*; **a computer ~** kompyuter ustası, kompyüteri əla bilən

**whizz²** [wɪz] *v* **1.** vızıldamaq; vıyıldamaq, vıyıltı ilə keçmək; havanı yararaq vızıltı ilə keçmək; *A bullet whizzed past my ear Güllə vızıltı ilə qulağımın yanından keçdi; The arrows/shells whizzed past Oxlar/Mərmilər vıyıltı ilə ötüb keçdi*; **2.** *d.d.* ildırım sürəti ilə getmək, sürətlə ötüb keçmək *(avtomobil, qatar və s.)*; *Cars went whizzling past Maşınlar ildırım sürəti ilə ötüb keçdi*; **3.** *məc.* gicəllənmək, fırlanmaq; *That makes my head whizz Bundan (mənim) başım gicəllənir*

**whizz-bang** [ˈwɪzbæŋ] *n hərb. d.d.* mərmi, güllə, qumbara; idarə olunan aviasiya bombası

**who¹** [hu:] *interrog. pron.* kim? kimə? kimi? *Who is he? O kimdir? Who broke the window? Pəncərəni kim sındırdı? Who is the woman in the black hat? Qara şlyapalı qadın kimdir? Who do you want? Sən/Siz kimi istəyirsən/istəyirsiniz? Who did you help? Sən/Siz kimə kömək etdin/etdiniz?*

**who²** [hu:] *rel. pron. Adətən Azərbaycan türkcəsinə tərcümə edilmir: The man who you saw... Sənin/Sizin gördüyün /gördüyünüz adam...; The man who was here is an artist Burada olan kişi rəssamdır; He doesn't know the people who live next door O, qonşuluqda yaşayan adamları tanımır; There's somebody who wants you on the telephone Səni/Sizi kimsə telefona çağırır*

**who³** [hu:] *conj. pron. Vasitəli sualları və budaq cümlələri başlayır:* **1.** kim? kimi? hansının? *Do you know who has come? Kimin gəldiyini bilirsənmi/ bilirsinizmi? Did he know who I was? O bildimi ki, mən kiməm? O mənim kim olmağımı bildimi? Ask him who found this Ondan soruş /soruşun ki, bunu kim tapdı?*; **2.** kim ki... o da, kimlər ki... onlar da; *Who breaks, pays Kim ki sındırır, o da pulunu ödəyir; I know who he's thinking of Mən bilirəm ki, o kimin haqqında düşünür, Mən onun kimin haqqında düşündüyünü bilirəm;*

◊ *Who is Who? Kim Kimdir? (bioqrafik soraq kitabçası); You'll soon find out who's who in the office Sən/Siz tezliklə idarədə kimin kim olduğunu aşkar edəcəksən/edəcəksiniz; He knows who is who O kimin kim olmağını bilir; Who on earth is it? Bu kim ola bilər ki? Who the devil told you that? Bunu sənə/sizə lənətə gəlmiş kim dedi axı?*

**whoe'er** [hu:ˈeəʳ] *şair.* = **whoever**

**whoever** [hu:ˈevəʳ] *indef. pron.* **1.** kim, kim olursa olsun, hansı olursa olsun; *Whoever says that is wrong Onu kim deyirsə, səhv edir; Whoever wrote this letter is a fool Bu məktubu kim yazıbsa yazsın, axmaqdır; I'll take whoever wants to go Kim getmək istəyirsə, onu aparacağam; Whoever it is, I don't want to see them/him Kim olursa olsun, mən onları/onu görmək istəmirəm*; **2.** *Təəccüb bildirir:* kim? *Whoever can be phoning us at this time of night? Gecənin bu vaxtı bizə kim zəng edə bilər?*

**whole¹** [houl] *n* **1.** bütöv, tam, bütün, hamısı; *The whole of (=all) the morning was wasted Bütün səhər hədər getdi*; **taken as a ~** bütövlükdə götürdükdə; **the ~ and the parts** tam və hissələr; *The whole of my money was stolen Pulumun hamısı oğurlandı*; **2.** hər şeyi, hamısını *(adət. ~ of)*; *I cannot tell you the whole (of it) Mən hər şeyi sənə deyə bilmərəm*;

◊ **as a ~** 1) bütövlükdə, birlikdə; *Is the collection going to be divided up or sold as a whole? Kolleksiya hissələrləmi, yoxsa bütövlükləmi satılacaq?*; 2) ümumiyyətlə; *The population as a whole is in favour of the reform Əhali bütövlükdə/ ümumiyyətlə reformanın/islahatın lehinədir*; **on/ upon the ~** nəticədə, əsasən, ümumiyyətlə; *On the whole, I'm in favour of the idea Mən, əsasən, bu fikrin tərəfdarıyam/lehinəyəm*

**whole²** [houl] *adj* **1.** tamam, bütöv; *He ate the whole loaf O, bütöv bir çörəyi tamam yedi; He swallowed the plum whole O, gavalını bütöv uddu; When I broke my leg, I spent a whole month in bed Mən qıçımı sındıranda, tamam/bütöv bir ay yorğan-döşəkdə yatdım; He sat next to me in the car and slept the whole way O, maşında mənim yanımda oturdu və bütün yolu yatdı*; **2.** bütün, tam; **the ~ world** bütün dünya; **the ~ country** bütün ölkə; **~ number** *riyaz.* tam ədəd; *I want to know the whole truth Mən bütün həqiqəti bilmək istəyirəm*; **3.** sağ-salamat, zərər dəyməmiş, salamat qalmış; *I hope you will come back whole Ümid edirəm ki, sən/siz sağ-salamat qayıdıb gələcəksən/gələcəksiniz; There is not a plate left whole Bir dənə də salamat/ sınmamış nimçə qalmayıb*; **4.** üzlü, qarışıqsız *(süd haq.)*; **~ milk** üzlü süd; **5.** doğma, qanbir; **a ~ brother** doğma qardaş; **6.** ələnməmiş *(un haq.)*;

◊ **~ life assurance/insurance** həyat sığortası; **to go the ~ hog** 1) bir şeyi əsaslı etmək, bir işi axıra çatdırmaq; 2) heç bir şeydən çəkinməmək, hər şeyə getmək; **to be the ~ show** *amer.* baş rol oynamaq

**whole blood** [ˈhoulˈblʌd] *n* **1.** eyni valideynlərdən törəmə; **brothers/sisters of the ~** qanbir/doğma qardaşlar/bacılar; **2.** safqanlılıq, əsillilik; **3.** cins heyvan

**whole-bred** [ˈhoulˈbred] *adj* cins, safqanlı, əsl, xalis

**whole-coloured** [ˈhoulˈkʌləd] *adj* birrəngli, eyni rəngli, saya, yekrəng

**whole-hearted** [ˈhoulˈha:tɪd] *adj* sədaqətli, səmimi, fədakar, hədsiz; **~ in one's devotion** hədsiz sədaqətli; **~ in one's sympathy** səmimi hüsn-rəğbət bəsləmə; **a ~ effort** səmimi/ürəkdən gələn səy

**whole-hogger** [ˈhoulˈhɔgəʳ] *n sl.* **1.** hər şeyi əsaslı edən adam, bir şeyi axıra qədər edən adam, heç bir şey qarşısında durmayan adam; **2.** *siya.* bir şeyə bərk etiqadı/inamı olan adam; bir şeyin bərk tərəfdarı

**whole-hoofed** [ˈhoulˈhu:ft] *adj zool.* təkdırnaqlı; *The horse is a whole-hoofed animal At təkdırnaqlı heyvandır*

**whole-length¹** [ˈhoulˈleŋθ] *n* bütün qamətilə çəkilən şəkil

**whole-length²** [ˈhoulˈleŋθ] *adj* boyun bərabəri olan, bütün qamətilə *(şəkil haq.)*

**wholemeal¹** [ˈhoulmi:l] *n* ələnməmiş/kəpəkli un

**wholemeal²** [ˈhoulmi:l] *adj* ələnməmiş, kəpəkli; **~ bread** kəpəkli/ələnməmiş undan bişirilən çörək, qara çörək

**wholesale¹** [ˈhoulseɪl] *n* topdansatış ticarəti

**wholesale²** [ˈhoulseɪl] *adj* **1.** topdansatış; **~ market** topdansatış bazarı; **~ prices** topdansatış qiymətləri; **~ dealer/merchant** topdansatış alverçisi/taciri; **2.** kütləvi, başdan-daşa, böyük ölçüdə; **the ~ slaughter of innocent people** günahsız /pak adamların kütləvi/ başdan-başa qırğını

**wholesale³** [ˈhoulseɪl] *v* topdansatış ticarəti (alveri) etmək; topdan almaq/satmaq; *These pencils wholesale at $ 3.00 per gross Bu karandaşların hər qrosu (12 düjün) 3 dollardır*

**wholesale⁴** [ˈhoulseɪl] *adv* **1.** topdan, böyük ölçüdə; **to sell ~** topdan satmaq; *I can get it for you wholesale Onu sənin/sizin üçün topdansatış qiymətinə ala bilərəm*; **2.** kütləvi surətdə, hamılıqla; **to kill people ~** camaatı kütləvi surətdə qırmaq

**wholesome** [ˈhoulsəm] *adj* **1.** xeyirli, faydalı, canaxeyirli; səmərəli, yaxşı; **~ food** canaxeyirli yemək/qida; **~ advice** faydalı/yaxşı məsləhət; **~ influence** səmərəli/xeyirli təsir; **~ climate** sağlam/ xeyirli iqlim; **2.** sağlam, gümrah; **~ appearance** sağlam/gümrah görkəm; **~ girl** gümrah /sağlam qız; **3.** mənəviyyatlı, sağlamdüşüncəli, sağlamfikirli, təmiz; *The novel is not wholesome Bu, ədəbsiz /mənaviyyatsız romandır*; **4.** *sl.* təhlükəsiz; *This place is not wholesome for us Bu yer bizim üçün təhlükəlidir*

**whole-souled** [ˈhoulˈsould] *adj* **1.** = **whole-hearted**; **2.** alicənab, nəcib; səxavətli, mənən zəngin

**wholly** [ˈhoulɪ] *adv* tamamilə, tamam, büsbütün, bütünlüklə; *I wholly agree Mən tamamilə razıyam*; **to be ~ at a loss** tamamilə özünü itirmək; *You were not wholly to blame for the accident Bu qəza üçün sən/siz tamamilə təqsirkar/günahkar deyilsən/ deyilsiniz*

**whom¹** [hu:m] *interrog. pron.* **who** *obyekt halı:* *kimi, kimə; Whom did you see there? Sən/Siz orada kimi gördün/gördünüz? Whom did you help? Sən/Siz kimə kömək etdin/etdiniz?*

**whom²** [hu:m] *rel. pron. Təyin budaq cümlələrini başlayır:* **Whom** *nisbi əvəzlikli tabeli mürəkkəb cümlə Azərbaycan türkcəsinə sadə geniş cümlə ilə tərcümə olunur; bu halda* **whom** *nisbi əvəzliyi tərcümə edilmir; The student whom I examined got an excellent mark Mənim imtahan etdiyim tələbə əla qiymət aldı; The person to whom this letter was addressed died three years ago Bu məktubun ünvanlandığı şəxs üç il bundan əvvəl ölüb*

**whoop¹** [hu:p] *n* **1.** səs, səda, nida; haray, gurultu, qışqırıq; **~ of joy** sevinc qışqırığı/nidası; **~ of laughter** qəhqəhə *(səsi)*; **2.** qıy vurma/çəkmə *(ovçular)*; ulama *(bayquş, yarasa)*; **3.** boğucu öskürək səsi;

◊ **not worth a ~** bir qara qəpiyə də dəyməz; *I don't care a whoop Heç vecimə də deyil*

**whoop²** [hu:p] *v* **1.** qışqırmaq, çığırmaq; haraylamaq; **to ~ for joy** sevincdən qışqırmaq; **to sing and to ~ with glee** şadlıqdan mahnı oxumaq və qışqırmaq; **2.** qıy vurmaq/çəkmək; **3.** ulamaq *(bayquş və s.)*; **4.** öskürmək, aramsız öskürmək, öskürməkdən boğulmaq;

◊ **to ~ it/things up** *sl.* dava-dalaş salmaq, şuluqluq etmək, qalmaqal salmaq; dələduzluq/ azğınlıq etmək

**whoopee** [ˈwupi:] *n d.d.* **1.** nida, səda, səs, sevinc səsi *(heyrətdən və s.)*; **2.** eyş-işrət, içki məclisi, əyyaşlıq; qonaqlıq; **to make ~** kef etmək/çəkmək, vaxtını kefdə keçirmək, vaxtını əyyaşlıqda keçirmək; səs-küylə şənlənmək

**whooping-cough** [ˈhu:pɪŋkɔf] *n tib.* göyöskürək

**whop** [wɔp] *v d.d.* **1.** döymək, vurmaq, kötəkləmək; **2.** üstün/qalib gəlmək; **3.** şappıltı ilə yıxılmaq/düşmək; **4.** kəskin döndərmək, birdən döndərmək; kənara sıçramaq

**whopper** [ˈwɔpəʳ] *n d.d.* **1.** zorba/nəhəng şey, çox yekə/iri şey; *The fisherman had caught a whopper Balıqçı nəhəng bir şey tutdu*; **2.** müdhiş həyasız yalan; *If she said that, she has told a real whopper Əgər o bunu demişdisə, deməli, o çox müdhiş bir yalan söyləmişdi*

**whopping[1]** ['wɔpɪŋ] *n d.d.* **1.** kötəkləmə, döymə, əzişdirmə, vurma; **to give smb. a ~** bir kəsi kötəkləmək/əzişdirmək; **2.** *məc.* məğlub olma *(mubahisə və s.)*

**whopping[2]** ['wɔpɪŋ] *adj d.d.* **1.** son dərəcə, olmazın dərəcədə, ifrat dərəcədə; **2.** *məc.* zorba, nəhəng, çox yekə/böyük; azman, müdhiş; **a ~ lie** müdhiş yalan; **a ~ big fish** nəhəng /çox yekə balıq

**whore[1]** [hɔ:ʳ] *n* **1.** *arx.* azğın, yava, əxlaqsız; **2.** *kob.* fahişə, qəhbə; **to play the ~** fahişəlik/qəhbəlik etmək

**whore[2]** [hɔ:ʳ] *v kob.* əxlaqsızlıq/ qəhbəlik/fahişəlik etmək

**whoredom** ['hɔ:dəm] *n* **1.** fahişəlik, qəhbəlik, əxlaqsızlıq; əxlaq pozğunluğu; **2.** *din.* bidət, küfr

**whore-house** ['hɔ:'haus] *n* fahişəxana, qəhbəxana, bardaq

**whoreson** [hɔ:sn] *n* **1.** *arx.* qanunsuz doğulmuş uşaq, bic; **2.** *d.d.* alçaq; it oğlu, köpək oğlu, qancıq oğlu

**whorl** [wə:l] *n* **1.** *bot.* çiçək köbəsi *(bitkinin gövdə ya saplağı üzərində eyni yüksəklikdə yerləşən yarpaqlar, budaqlar)*; **2.** buruq, burum, qıvrım *(balıqqulağında, ilbizdə)*; **3.** barmaq izi/naxışı; **to identify a criminal by the ~s of his fingerprints** barmaq izlərinə əsasən cinayətkarın şəxsiyyətini müəyyən etmək; **4.** *toxuc.* iy/mil bloku

**whortleberry** ['wə:tl.berɪ] *n bot.* qaragilə, mərcanı; **bog ~** cır mərcanı *(giləmeyvə)*; **red ~** qırmızı morsin

**whose[1]** [hu:z] *poss. pron.* kimin? *Whose umbrella is this? Bu kimin çətiridir? Whose daughter are you? Sən/Siz kimin qızısan/qızısınız? Whose are these books? Bu kitablar kimindir?*

**whose[2]** [hu:z] *rel. pron. Təyin budaq cümlələrində işlənir: Azərbaycan türkcəsinə tərcümə edilmir.* kimin ki? hansının ki? hansı; **the tree under ~ shade we are sitting** kölgəsi altında oturduğumuz ağac; **the boy ~ father is a singer** atası müğənni olan oğlan; **the house ~ windows are broken** pəncərələri sınmış ev

**whose[3]** [hu:z] *conj. pron. Vasitəli suallarda və budaq cümlələrdə işlənir.* kimin? *I wonder whose house that is Maraqlıdır bu kimin evidir?*

**why[1]** [waɪ] *(pl -s [-z] n* səbəb, əsas; **to go into the ~s and wherefores of it** bir şeyin səbəbinə varmaq; *I don't need to hear all the whys and the wherefores, just tell me what happened Mən heç də bütün səbəbləri eşitmək istəmirəm, mənə nə baş verdiyini söylə/söyləyin*

**why[2]** [waɪ] *interrog. adv* niyə? nə üçün? nəyə görə? nə əsasla? *Why were you late? Sən/Siz nəyə görə gecikmişdin/gecikmişdiniz?; Why did you buy those shoes? Sən/Siz nəyə görə/nə üçün o ayaqqabıları aldın/aldınız?* **~ so?** nə səbəbə? hansı əsasla? **~ not** nəyə görə yox? nə üçün yox?

**why[3]** [waɪ] *rel. adv* nəyə görə? *This is the reason why I left so early Nəyə görə tez çıxıb getməyimin səbəbi budur*

**why[4]** [waɪ] *conj. adv* niyə? nə üçün? *I don't know why they are late? Onların niyə/nə üçün gecikdiklərini mən bilmirəm*

**why[5]** [waɪ] *interj.* **1.** *Təəccüb bildirir: Why, it is quite easy! Bu ki, lap asandır! Why, it is Smith! Hə, bu ki Smitdir! Why, what's the matter! Hə, nə olub ki! Nə baş verib ki!* **2.** *Səbirsizlik bildirir: Why, of course I do Hə də, əlbəttə ki edirəm!* **3.** *Tərəddüd, qətiyyətsizlik bildirir: Why, yes, I think so Sənə/ Sizə necə deyim? Bəli, mən belə fikirləşirəm! What is twice two? – Why, four! İki dəfə iki neçə edər? Əlbəttə ki dörd;* **4.** *Etiraz bildirir: Why, what is the harm! Hə, zərəri/ziyanı nədir ki!*

**wick** [wɪk] *n* **1.** fitil, piltə; *Trim the wick of a lamp Lampanın fitilini kəs/kəsin;* **2.** *tib.* tampon

**wicked[1]** ['wɪkɪd] *n pl* **(the ~)** *top.* i günahkarlar, murdarlar; şeytanlar; rəzillər

**wicked[2]** ['wɪkɪd] *adj* **1.** qəddar, zalım; qəzəbli, kinli; yaman, pis; mənəviyyatsız; ədəbsiz; *It is wicked of you to torment the poor cat Yazıq pişiyə əzab verməklə sən/siz qəddarlıq edirsən/edirsiniz;* **man ~ in his behaviour** özünü mənəviyyatsız aparan adam; **2.** günahkar; murdar, iblis, şeytan; fani; **the ~ one** günahkar, iblis, şeytan, cin; **~ world** fani dünya; **~ thoughts** murdar/pis fikirlər; **3.** dəcəl, nadinc, şuluq *(uşaq haq.)*; **4.** yırtıcı, quduz, vəhşi *(heyvan haq.)*; **~ dog** quduz it; **5.** təhlükəli, qorxulu, ölümcül *(yara, zərbə və s. haq.)*; **~ blow** ölümcül zərbə; arxadan vurulan zərbə; **6.** pis, xoşagəlməz, mənfur, iyrənc *(qoxu, iy və s. haq.)*; **~ odour** pis/iyrənc iy; *He had a wicked twinkle in his eye Onun gözündə mənfur bir işartı /parıltı var idi;* **7.** çox, dəhşətli, çox pis; **a ~ hot day** dəhşətli isti gün, çox isti gün;

◊ *She shakes a wicked calf amer. O yaman rəqs edir*

**wickedness** ['wɪkɪdnɪs] *n* **1.** qəddarlıq, zalımlıq; yamanlıq, kinlilik, qəzəblilik; **2.** münasibətsiz hərəkət; pis əda; nəzakətsizlik, ədəbsizlik; **3.** cinayət, canilik, cinayətkarlıq; **4.** *din.* günah, günahkarlıq

**wicker[1]** ['wɪkəʳ] *n* **1.** hörmək üçün çubuq; **2.** hörmə zənbil

**wicker[2]** ['wɪkəʳ] *adj* hörmə; toxunma

**wicker[3]** ['wɪkəʳ] *v* hörmək *(çubuqdan)*

**wicker-work** ['wɪkəwə:k] *n* **1.** hörmə, toxuma; **2.** *top.i* hörmə məmulatları, hörmə şeylər *(xüs. zənbil)*; **~ chair** hörmə stul

**wicket** ['wɪkɪt] *n* **1.** doqqaz, kiçik qapı *(hasarda, darvazada)*; **2.** turniket *(adamları bir-bir növbə ilə buraxmaq üçün bir yerin girəcəyində qoyulan fırlanan çarpaz qapı)*; **3.** qapıcıq *(kriket oyununda)*; **4.** açılıb-örtülən pəncərə *(kassada, qapıda)*

**wicket-keeper** ['wɪkɪt.ki:pəʳ] *n* qapıçı *(kriket oyununda)*



**wickiup** ['wɪkɪʌp] *n amer.* **1.** koma, daxma *(hinduların)*; **2.** müvəqqəti sığınacaq, daxmacıq

**wide[1]** [waɪd] *adj* **1.** enli, geniş; **a ~ road** enli/geniş yol; **a ~ river** enli çay; *The gate isn't wide enough to get the car through Darvaza kifayət qədər geniş/enli deyildir ki, maşını içəri keçirmək mümkün olsun;* **~ screen** *kino.* geniş/böyük ekran; **2.** hərtərəfli, geniş, böyük; **~ knowledge** hərtərəfli/ geniş bilik; **~ interests** hərtərəfli maraqlar; **~ difference** böyük fərq; **the ~ world** geniş dünya; *The library has books on a wide variety Kitabxanada müxtəlif çeşiddə kitablar var;* **a manager with ~ experience of industry** sənayedə hərtərəfli təcrübəsi olan menecer; **3.** geniş açılmış *(göz haq.)*; **to stare with ~ eyes** geniş açılmış gözlərlə baxmaq; **4.** uzaq; *This is wide of the truth Bu, həqiqətdən uzaqdır; Her shot was wide of the target Onun atəşi hədəfdən uzağa düşdü;*

◊ **~ envelopment** *hərb.* yoxlama

**wide[2]** [waɪd] *adv* **1.** geniş, tamam, böyük ölçüdə; hər yeri, hər tərəfi; *He travelled far and wide O, bütün dünyanı gəzdi;* **with legs ~ apart** qıçları tamam aralı; *Open your mouth wide! Ağzını/Ağzınızı geniş aç/açın;* **2.** taybatay; **to open/to fling/to throw ~** taybatay açmaq; *The door was wide open Qapı taybatay açılmışdı;* **3.** uzaq, hədəfdən uzaq; *The arrow fell wide of the mark Ox nişangahdan uzağa düşdü;* **~ apart** bir-birindən uzaq; **~ of the truth** həqiqətdən uzaq; *The ball went wide Top uzağa getdi;* **to speak ~** mahiyyətdən danışmamaq, məsələdən kənara çıxmaq

**wide-awake[1]** ['waɪdə'weɪk] *n d.d.* yanları enli keçə şlyapa

**wide-awake[2]** ['waɪdə'weɪk] *adj* **1.** ayıq qalan /olan, yatmayan, yuxusuz; **2.** sayıq, ayıq-sayıq, diqqətli, ehtiyatlı; *He felt wide-awake to his surroundings O, ətrafındakılara qarşı diqqətli /ehtiyatlı idi;* **3.** *d.d.* mahir, diribaş, zirək; fəndgir, hər yerə yol tapan, bic

**wide-eyed** ['waɪd'aɪd] *adj* geniş açılmış gözlərlə *(heyrət və s. nəticəsində)*

**widely** ['waɪdlɪ] *adv* **1.** çox, çox dərəcədə; *We differ widely in our political views Biz siyasi baxışlarımıza görə/ nöqteyi-nəzərimizcə çox fərqlənirik;* **2.** geniş, çox; *His books are widely read in Europe Onun kitabları Avropada çox oxunur;* **~ known** çox məşhur, hamı tərəfindən tanınmış; **~ scattered** geniş səpələnmiş; **3.** uzaq, uzaq məsafədə, çoxdan; **~ separated** çoxdan ayrılmış

**widen** ['waɪdn] *v* **1.** genişləndirmək, artırmaq; enlətmək; **to ~ one's outlook** dünyagörüşünü artırmaq/genişləndirmək; *The road is being widened Yolu enlədirlər/ genişləndirirlər;* **2.** genişlənmək, genəlmək; enlənmək; artmaq; *Here the stream widenes (out) into a river Burada axın genişlənib çaya çevrilir*

**wide-open** ['waɪd'oupən] *adj* **1.** geniş açılmış; **with ~ eyes** geniş açılmış gözlərlə *(heyrətdən, təəccübdən və s.)*; **2.** *d.d.* qorunmayan, müdafiə olunmayan/ edilməyən; **3.** *amer.* azartlı oyunlara/spirtli içkilərin satılmasına icazə verən; **~ town** azartlı oyunların aparılmasına/ spirtli içkilərin satılmasına icazə verilən şəhər

**wide-spread** ['waɪd'spred] *adj* geniş yayılmış, hər tərəfə yayılmış/uzanmış; **~ damage** çox böyük zərər/ziyan

**widgeon** ['wɪdʒən] *n* vəhşi ördək

**widish** ['waɪdɪʃ] *adj* geniştəhər

**widow[1]** ['wɪdou] *n* **1.** dul arvad; *The woman has been a widow for ten years Qadın on ildir ki, dul qalıb;* **to become a ~** dul qalmaq/olmaq; **~'s weeds** dul qadının matəm paltarı; **2.** *poliqr.* artıq sətir

**widow[2]** ['wɪdou] *v* **1.** dul qalmaq/olmaq; *She was widowed by the war Müharibə onu dul etdi, Müharibə onun ərini əlindən aldı; She was widowed at an early age O, erkən yaşdan dul qaldı;* **2.** *şair.* məhrum etmək, əlindən almaq, binəsib etmək

**widowed** ['wɪdoud] *adj* dul qalmış; **his ~ father** onun dul qalmış atası

**widower** ['wɪdouəʳ] *n* dul kişi

**widowhood** ['wɪdouhud] *n* **1** dulluq, dul olma *(kişi və ya qadın haq.)*

**widow's walk** ['wɪdouzwɔ:k] *n* evin damında məhəccərli meydança

**width** [wɪdθ] *n* **1.** en; genişlik, gen-bolluq; **in ~** eninə; **ten metres in ~** on metr enində; *The carpet is available in various widths Müxtəlif endə xalça əldə etmək mümkündür;* **a road of great ~** çox enli/geniş yol; **2.** *məc.* vüsət, genişlik; **~ of mind/intellect** ağıl /zəka genişliyi; **3.** taxta; parça zolağı; *Join two widths of cloth Paltarın iki taxtasını birləşdir/ birləşdirin; You need three widths for the skirt Bu yubkaya sənə/sizə üç taxta parça lazımdır;* **4.** *tex.* göz; ara, aralıq; **5.** *geol.* qalın lay/təbəqə

**wield** [wi:ld] *v* **1.** əlində saxlamaq *(silah və s.)*; sahib/ malik olmaq; **to ~ an axe/a sword/a tennis racket** baltanı/qılıncı/tennis raketini əlində saxlamaq; **to ~ a formidable pen** iti qələmə sahib olmaq; **2.** öz əlində saxlamaq, hakimiyyətə malik olmaq; **to ~ power** hakimiyyəti (öz) əlində saxlamaq, hakimiyyətə malik olmaq; **to ~ influence** nüfuzdan istifadə etmək; **to ~ control** nəzarət etmək; **to ~ the sceptre** hökmranlıq etmək, hökmfərman olmaq; dövləti idarə etmək

**wieldly** ['wi:ldlɪ] *adj* asan idarə olunan, itaətkar, üzüyola, sözə qulaq asan

**wife** [waɪf] *n (pl* **wives** [waɪvz]) **1.** arvad, zövcə, həyat yoldaşı; **2.** *d.d.* uşaqların anası; **the doctor's ~** həkimin arvadı; *She is his second wife O, onun ikinci arvadıdır;* **to take a ~** evlənmək; **to take to ~** arvad almaq; **~ of Mr. Smith** Cənab Smitin arvadı; **~ to Tom** Tomun arvadı; **3.** *arx.* qadın; **an old ~** qarı, qoca arvad; **old wives' tale**

dedi-qodu, ara söhbətləri; 4. (~ **wife**) *mürəkkəb sözlərin komponenti*: house**wife** evdar qadın; fish**wife** balıq satan arvad; mid**wife** mamaça;

◊ **all the world and his** ~ *zaraf.* bütün dünya/aləm; hamı

**wifeless** ['waɪflɪs] *adj* 1. arvadsız, dul; 2. subay, evlənməmiş

**wifelike** ['waɪflaɪk] *adj* = **wifely**

**wifely** ['waɪflɪ] *adj* arvada xas olan, arvada layiq, arvada münasib; arvada yaraşan; arvadsayaq; ~ **duties/virtues** qadına/arvada layiq vəzifələr/ləyaqət; **with ~ patience** arvada/qadına xas olan səbrlə

**wig** [wɪg] *n* 1. parik *(qoyma/süni saç)*; *Wigs are worn Pariklər köhnəlib/əldən düşüb; She disguised herself with a brown wig and dark glasses O özünü qəhvəyi rəngli parik və qara şüşəli eynəklə maskaladı/ tanınmaz etdi*; 2. *zaraf.* tük, saç; gur saç; 3. *d.d.* parik geymiş vəzifəli şəxs *(hakim və s.)*;

◊ *My wig(s)! Aman Allah! (təəccüb bildirir)*; **~s on the green** vuruşma, dava-dalaş, vurhavur; qarışıqlıq; **to blow *one's* ~** dəli olmaq, qəzəbdən nə edəcəyini bilməmək

**wigging** ['wɪgɪŋ] *n d.d.* söyüb danlama, abrını alma/vermə, bərk məzəmmət, şiddətli töhmət, qulaqburması; **to get/to give *smb.* a good ~** bir kəsə yaxşıca qulaqburması vermək; abrını almaq/ətəyinə bükmək

**wiggle**[1] [wɪgl] *n* asta-asta yırğalama/yırğalanma; qurdalanma, qımıldanma; yerində rahat oturmama;

◊ **to get a ~ on** tələsmək, hərəkətə gəlmək

**wiggle**[2] [wɪgl] *v* 1. asta-asta yırğalanmaq/yırğalamaq; tərpətmək, dəbərtmək; 2. tərpənmək, yerində rahat oturmamaq, qımıldanmaq, qurdalanmaq; *The baby was wiggling its toes Bəbə ayağının baş barmaqlarını tərpədirdi; Don't wiggle Qımıldanma, Tərpənmə*; **to ~ *one's* eyebrows** qaşlarını çatmaq/ tərpətmək; *Their bottoms wiggled as they danced Rəqs etdikcə onların yanbızları yırğalanırdı*

**wig-wag**[1] ['wɪgwæg] *n hərb., dən.* bayraqcıqlarla işarə vermə

**wig-wag**[2] ['wɪgwæg] *v d.d.* 1. bayraqcıqlarla işarə /xəbər vermək *(dənizdə, dəmir yolunda və s.-də)*; 2. ora-bura/ irəli-geri getmək *(hərəkət haq.)*

**wig-wag**[3] ['wɪgwæg] *adv* irəli-geri, ora-bura

**wild**[1] [waɪld] *n* (**the ~s**) səhra, biyaban; cəngəllik *(qalın meşəlik)*; **the ~s of Africa** Afrika cəngəllikləri; **to live out in the ~s** təbiətin qoynunda yaşamaq, vəhşi həyat sürmək

**wild**[2] [waɪld] *adj* 1. 1) vəhşi, yırtıcı; ~ **animals** yırtıcı heyvanlar; **a ~ cat/duck** vəhşi pişik/ördək; ~ **tribes** vəhşi tayfalar; 2) yabanı *(bitki və meyvələr haq.)*; ~ **flowers/roses/strawberries** yabanı bitkilər/ qızılgüllər /çiyələklər; 2. xam, becərilməmiş; boş, kimsəsiz; ~ **areas of land** xam/boş torpaq sahələri; 3. əl dəyməmiş; ~ **land** əl dəyməmiş/xam torpaq; ~ **forest** balta dəyməmiş meşə; 4. hürkək, hürkəyən *(quşlar, heyvanlar və s. haq.)*; *The deer are rather wild Marallar çox hürkəkdirlər*; 5. coşğun, azğın, özbaşına, cilovlanmayan; *They seem to let their children run wild Onlar deyəsən öz uşaqlarını özbaşına buraxırlar*; **a ~ life** azğın həyat; ~ **delight** coşğun heyranlıq/ məftunluq; 6. qəzəbli, qeyzli; qudurğan; acıqlandırılmış, hirsləndirilmiş; təxərrüşə gətirilmiş; haldan/özündən çıxmış; ağılsız, dəli-divanə; **to be ~ about *smth*.** bir şeydən ötrü dəli-divanə olmaq; **in ~ spirits** özündən çıxmış halda; *It drives me wild Bu məni qəzəbləndirir/ özümdən çıxarır*; **~ with anger** qəzəbdən özündən çıxmış; **~ with joy** sevincdən özündən çıxmış; 7. bərk, fırtınalı, boranlı, tufanlı, coşğun; ~ **wind** bərk/coşğun külək; ~ **night/ weather** fırtınalı/tufanlı gecə /hava; ~ **waves** coşğun dalğalar; 8. tələm-tələsik, lazımınca düşünülməmiş, fikirləşmədən edilən; qarasına, hər nə cür gəldi; ~ **shot** qarasına/təvəkkülə atılan güllə; **a ~ idea/guess** mübhəm fikir/zənn; qeyri-müəyyən fikir/fərz; 9. əsassız fikir/güman; əsassız ehtimal/xəyal /uydurma; 10. *d.d.* intizamsız, əxlaqsız, pozğun; **a ~ fellow** avara, veyl; *He had a wild life in his youth O, gəncliyində çox pozğun bir həyat sürüb*; 11. səliqəsiz; pərişan, dağınıq; ~ **hair** pərişan/dağınıq saçlar;

◊ **to run ~** 1) basmaq *(ot, tük, kol və s.)*; 2) nadan/təhsilsiz böyümək; 3) pozğun/avara/ nəzarətsiz/ özbaşına həyat tərzi keçirmək; *They allow their children to run wild Onlar öz uşaqlarına avara həyat tərzi keçirməyə icazə verirlər*

**wild**[3] [waɪld] *adv* hər nə cür gəldi, qarasına, təvəkkülü

**wild boar** ['waɪld'bɔ:ʳ] *n zool.* qaban, çöldonuzu

**wildcat**[1] ['waɪldkæt] *n d.d.* 1. vəhşi pişik; 2. tez özündən çıxan/hirsli/ tündməcaz/ tündxasiyyət/qeyzli adam; 3. qorxulu/təhlükəli/xətərli iş

**wildcat**[2] ['waɪldkæt] *adj* 1. təhlükəli *(iş, plan və s. haq.)*; ~ **venture** fırıldaq, şübhəli iş/təşəbbüs; 2. qeyri-qanuni, razılaşdırılmamış, özbaşına; **a ~ strike** qeyri-rəsmi/icazəsiz tətil; 3. həyata keçə bilməyən, fantastik; ~ **schemes** fantastik planlar; 4. *amer. d.y.* cədvəl üzrə hərəkət etməyən

**wildcherry** ['waɪld'tʃerɪ] *n* yabanı albalı/gilas, çöl gilası/albalısı

**wild duck** ['waɪld'dʌk] *n* vəhşi ördək, çöl ördəyi

**wildebeest** ['wɪldɪbi:st] *n zool.* qnu *(antilop cinsindən Cənubi Afrikada yaşayan heyvan)*

**wilderness** ['wɪldənɪs] *n* 1. çöl, çöllük, biyaban, səhra; 2. bağ yaxud parkın əl dəyməmiş təbii şəkildə başlı-başına buraxılmış hissəsi; *From his attic window he looked out a wilderness of roofs Çardağın pəncərəsindən o, başlı-başına buraxılmış damların üstünə baxdı*; 3. külli miqdar, çoxluq;



◊ **a voice in the ~** *din.* cavabsız çağırış

**wildfire** ['waɪld,faɪəʳ] *n* 1. parıltı *(üfüqdə)*; şimşək, şimşək qığılcımları; 2. yunan məşəli/odu /atəşi; 3. *məc.* yanğın; **to spread like ~** şimşək sürətilə yayılmaq *(alov, şayiə, qeybət və s.)*; **the ~ of passion** ehtiras atəşi; 4. *tib.* qızıl yel *(yoluxucu dəri xəstəliyi)*

**wildfowl** ['waɪldfaul] *n* çöl quşu; ov quşları, qanadlılar, quşlar

**wild-goose** ['waɪldgu:s] *n* vəhşi qaz, çöl qazı;

◊ **~ chase** ağılsız təşəbbüs, havayı iş/niyyət/fikir, havayı yerə bir şeyin dalınca qaçma *(xoşbəxtlik və s.)*

**wilding** ['waɪldɪŋ] *n* 1. *bot.* cır/yabanı bitki; 2. *d.d.* cır alma/armud və s.

**wildlife** ['waɪldlaɪf] *n* canlı təbiət *(meşə, çöl, biyaban, okean və onların məskunları)*

**wildly** ['waɪldlɪ] *adv* 1. vəhşicəsinə, azğıncasına; dəli kimi; **to rush ~ from room to room** otaqdan-otağa dəli kimi qaçmaq; **to talk ~** dəli kimi danışmaq; 2. hədsiz; **a ~ exaggerated account** hədsiz şişirdilmiş hesabat; ~ **funny** hədsiz dərəcədə məzəli/gülməli

**wildman** ['waɪldmæn] *n* 1. vəhşi adam; 2. qatı /ifrat inam tərəfdarı olan adam

**wild oat(s)** ['waɪld'out(s)] *n bot.* vələmir *(yulafca)*;

◊ **to sow *one's* ~** gənclik əyləncələrinə aludə olmaq; *He has sown his wild oats O quduzlaşıb, O qudurub, O dəli olub*

**wild pear** ['waɪld'peəʳ] *n* çöl armudu, yabanı armud

**wild pig** ['waɪld'pɪg] *n* = **wild boar**

**wildradish** ['waɪld'rædɪʃ] *n bot.* yabanı turp, çöl turpu

**wild rose** ['waɪld'rouz] *n bot.* itburnu

**wild sow** ['waɪld'sou] *n* vəhşi donuz, çöldonuzu

**wild strawberry** ['waɪldstrɔ:bərɪ] *n* yabanı çiyələk, meşə çiyələyi

**wild turnip** ['waɪld'tə:nɪp] *n bot.* vəzərək *(bitki)*

**wile**[1] [waɪl] *n* biclik, kələk; aldatma, yalan satma, kələk gəlmə; *She used all her feminine wiles to get her way Öz istədiyinə nail olmaq üçün qadına xas olan bütün kələkləri işlətdi*

**wile**[2] [waɪl] *v* aldadıb gətirmək/tora salmaq, aldadıb aparmaq;

◊ **to ~ away the time** vaxtı çox yaxşı keçirmək, yaxşı əylənmək

**wilful** ['wɪlful] *adj* 1. tərs, inadcıl, inadkar, öz bildiyini edən; özbaşına; **a ~ child** tərs/inadkar uşaq; 2. qəsdən/biləlrəkdən/qərəzlə/bilə-bilə edilən; ~ **damage** qəsdən vurulan ziyan; ~ **murder** qəsdən edilən qətl

**will**[1] [wɪl] *n* 1. iradə, iradə qüvvəsi; **the ~ to live** yaşamaq iradəsi; **strong/weak/iron ~** güclü/zəif/dəmir iradə; **lack of ~** iradəsizlik, iradə zəifliyi; *He has no will of his own Onun özünün iradəsi yoxdur; She shows great strength of will O, böyük iradə nümayiş etdirir*; 2. arzu, möhkəm niyyət, istək; *Her death is God's will/the will of God Onun ölümü Allahın iradəsidir/istəyidir*; **against *one's* ~** iradəsi əleyhinə/xilafına; *What is your will? Sənin/Sizin istədiyin/istədiyiniz nədir?*; **to have *one's* ~** öz istəyinə nail olmaq; **a ~ of *one's* own** özbaşınalıq; **of *one's* own free ~** könüllü, öz arzusu ilə; *She seems to have lost the will to live Belə görsənir ki, o, yaşamaq istəyini itiribdir*; 3. səy, ruh yüksəkliyi; vəcd, şövq; qeyrət; qətiyyət; **to work with a ~** səylə/şövqlə işləmək; *They pulled with a will Onlar var gücləri ilə dartdılar*; 4. vəsiyyət, son arzu; **to make/ to draw up *one's* ~** vəsiyyət etmək; *Have you made a/your will? Sən/Siz vəsiyyətini/vəsiyyətinizi etmisənmi/etmisinizmi?* **last ~ and testament** sonuncu arzu /vəsiyyət *(vəsiyyətnamədə işlədilən yuridik forma)*;

◊ **at ~** 1) istədiyi kimi; *Come and go at will İstədiyin zaman gəl və get; The animals are allowed to wander at will in the park Heyvanlara parkda istədikləri yerlərdə gəzməyə/dolaşmağa icazə verilir*; 2) *hərb.* tək-tək atəş *(əmr)*; **to take the ~ for the dead** bircə dəfə kömək etmək arzusuna görə minnətdar olmaq; **with a ~** həvəslə; *They set to work with a will Onlar həvəslə işə başladılar/ girişdilər; Where there is a will there is a way ≅ Niyyətin hara, mənzilin də ora, Çobanın könlü olsa təkədən pendir tutar*

**will**[2] [wɪl] *v* I 1. iradə göstərmək, öz iradəsini büruzə vermək; istəmək, arzulamaq, arzu etmək; *Let him do what he wills Qoy/Qoyun o, istədiyini etsin; God has willed it so Allah belə məsləhət bilib/Allahın iradəsi belədir! Fate willed it that he should die young Onun alnına gənc ikən ölmək yazılıbmış; Call it what you will, it's still a problem Necə istəyirsən, o cür də de, o hələ də bir problem olaraq qalır; You're free to travel where you will in the country Ölkədə istədiyin yerə səyahət etməkdə azadsan*; 2. məcbur/vadar etmək, beyninə yeritmək; **to ~ oneself to fall asleep** özünü yatmağa məcbur etmək; **to ~ *smb.* to do *smth*.** bir kəsi bir şey etməyə vadar etmək; 3. vəsiyyət etmək; *He willed most of his money to charities O öz pullarının çox hissəsini xeyriyyə işlərinə vəsiyyət etdi; My father willed me the house and my sister his stocks Atam evini mənə, aksiyalarını/ səhmlərini isə bacıma vəsiyyət etdi*

**will** [wɪl] *v* II *(pt* **would**) 1. *köməkçi fel: 2-ci və 3-cü şəxslərin tək və cəmində gələcək zaman formasını düzəltmək üçün işlədilir; He will play the piano at 10 o'clock O, saat 10-da piano çalacaq; She will come tomorrow O sabah gələcək; You will write to us, won't you? Sən/Siz bizə yazacaqsan/ yazacaqsınız, elə deyilmi?*; 2. *Digər fellərlə birləşmədə adi hərəkəti bildirir və əksərən tərcümə olunmur; Boys will be boys Oğlan elə həmişə oğlandır; Accidents will happen Bədbəxt hadisələr/ qəzalar həmişə baş verir; He'll sit*

*there hour after hour looking at the traffic go by O. saatlarla orada oturub gedib-gələnlərə baxır*; 3. *Modal fel kimi aşağıdakı mənaları bildirir*: **1)** *niyyət, qətiyyət, vəd (xüs. 1-ci şəxs tək və cəmdə)*; *I will let you know Mən mütləq sənə/sizə xəbər verərəm; We'll pay back the money soon Biz pulu mütləq tezliklə qaytaracağıq*; **2)** yəqinlik, ehtimal, mümkünlük, güman, təxmin, fərz; *You will be Mrs. Smith Siz yəqin ki, xanım Smitsiniz, Siz deyəsən xanım Smitsiniz*; **4.** *xahiş, dəvət yaxud təklif (nəzakət formasında)*; *Will you have a cup of tea? Bir stəkan çay istəmirsən/istəmirsiniz?; Will you tell me the time? Zəhmət olmasa, deyə bilərsənmi/bilərsinizmi saat neçədir?*

**-willed** [-wɪld] *mürəkkəb sözlərdə*: self-**willed** özbaşına, kefi istədiyi kimi hərəkət edən; ill-**willed** pisfikirli, pisniyyətli, qərəzli; qərəzkar

**willies** ['wɪlɪz] *n pl* (*adət*. **the** ~) əsəbi vəziyyət, əsəbdən titrəmə/əsmə; *This gloomy old house gives me the willies Bu qaranlıq köhnə ev mənim canıma lərzə salır/məni əsəbiləşdirir*

**willing** ['wɪlɪŋ] *adj* **1.** bir şeyi etməyə hazır olan; bir şeyə razı olan, razı; *He's quite willing to pay the price I ask O mən istədiyim qiyməti verməyə razıdır; Are you willing to help? Sən/Siz kömək etməyə razısanmı/razısınızmı?*; **2.** könüllü; ~ **help** könüllü kömək; ~ **obedience** könüllü itaətkarlıq; ~ **cooperation** könüllü əməkdaşlıq; **3.** səyli, çalışqan, canyandıran; **a** ~ **worker** çalışqan fəhlə/ işçi;
◊ ~ **horse** işlək/çalışqan adam; ~ **ear** iltifatlı/ xeyirxah diqqət yetirmə, qulaqasma arzusu; **God** ~ Allahın köməyi ilə; *Nothing is impossible to a willing heart/mind at. söz. Çobanın könlü olsa təkədən pendir tutar ≅ Səbr ilə halva bişər, ey qora səndən*

**willingly** ['wɪlɪŋlɪ] *adv* həvəslə, məmnuniyyətlə, razılıqla; *He willingly agreed to give her a lift Onu maşınla aparmağa o məmnuniyyətlə razı oldu*

**willingness** ['wɪlɪŋnɪs] *n* hazırlıq, hazır olma; razılıq, razı olma

**will-o'-the-wisp** ['wɪləðwɪsp] *n* **1.** bataqlıq alovu *(gecələr bataqlıq yerlərdə görünən zəif alov)*; **2.** *məc*. nə isə aldadıcı şey; ələkeçməz/tutulmaz şey; *You shouldn't hope to find perfect happiness – it's just a will-o'-the-wisp Sən/Siz əsl xoşbəxtlik tapmaq ümidində olmamalısan/olmamalısınız – bu, mümkün olan şey deyildir/bu, əlçatmaz bir şeydir/ bu, xam xəyaldır*

**willow**[1] ['wɪlou] *n* **1.** *bot*. söyüd; **2.** *id. d.d.* ağac, toxmaq *(kriket, beysbol və s. oyunlarında işlədilən)*; **to wield the** ~ kriket oyunu oynamaq; **3.** *toxuc*. dəm qazını və s. təmizləyən maşın;
◊ **to wear the (green)** ~ yas paltarı geymək, matəm saxlamaq *(əri, sevgilisi üçün)*

**willow**[2] ['wɪlou] *v toxuc*. tozsuzlaşdırmaq *(yunu)*, tozunu çırpmaq *(yunun)*

**willow-herb** ['wɪlouhə:b] *n bot*. yağı otu *(çay əvəzinə işlədilən iri çiçəkli ot)*

**willow-pattern** ['wɪlou,pætən] *n* **1.** çini qab üzərində /Çin üslubunda mavi naxış; **2.** üzərində Çin trafaret şəkli olan çini qab

**willowy** ['wɪloui] *adj* **1.** söyüdlü, söyüd basmış; **2.** qədd-qamətli, zərif, qıvraq; ~ **figure** qədd-qamətli/ zərif boy-buxun; **a** ~ **young actress** zərif/qədd-qamətli gənc aktrisa

**will-power** ['pɪl,pauəʳ] *n* iradə gücü/qüvvəsi

**willy-nilly** ['wɪlɪ'nɪlɪ] *adv* istər-istəməz, naəlac; *He was forced willy-nilly to sit through a lot of boring speeches İstər-istəməz onu bir çox zəhlətökən nitqlərə qulaq asmağa məcbur etdilər*

**wilt**[1] [wɪlt] *n* **1.** ətalət, kəsalət, süstlük, keylik, ölüvaylıq; **2.** solma *(bitki, gül və s.)*

**wilt**[2] [wɪlt] *v* **1.** süstləşmək, keyləşmək, ağırlaşmaq; zəifləmək, düşmək; *The spectators were wilting visibly in the hot sun Tamaşaçılar isti günəşdə açıq-aydın süstləşmişdilər*; **2.** solmaq, zay olmaq, korlanmaq *(gül)*; *The flowers are wilting from lack of water Susuzluqdan güllər zay olur*; **3.** *məc*. ruhdan /həvəsdən düşmək; üzülmək; *I'm wilting in this heat Mən bu istidən üzülürəm, Bu isti məni üzür*

**Wilton** ['wɪltən] *n toxuc*. xovlu xalça növü *(həm də* ~ **carpet)**

**wily** ['waılı] *adj* hiyləgər, kələkbaz, bic, fəndgir; xain, məkrli, iblis; **a** ~ **old fox** hiyləgər qoca tülkü

**wimble** ['wɪmbl] *n* burğu, matqab

**wimple** ['wɪmpl] *n rahibələrin başlarına saldıqları örtük*

**win**[1] [wɪn] *n* **1.** qələbə; uduş, udma *(oyunda və s.)*; **2.** *pl* udulmuş pullar

**win**[2] [wɪn] *v (pt, pp* **won** [wʌn]; *pr.p* **winning) 1.** udmaq, qələbə çalmaq, qalib gəlmək; **to** ~ **the battle** döyüşü udmaq, döyüşdə qalib gəlmək; **to** ~ **a contest** yarışda qələbə çalmaq; **to** ~ **an election** seçkidə qalib gəlmək/çıxmaq, seçkidə qələbə qazanmaq/çalmaq; *Which team won? Hansı komanda qalib gəldi? France won by six goals to two Fransa 6:2 hesabı ilə qalib gəldi; She won first prize O, birinci mükafatı aldı; The conservatives won the seat at the last election Mühafizəkarlar sonuncu seçkidə (Parlamentdə) yer qazandılar*; **to** ~ **a piece** fiquru udmaq *(şahmatda)*; **to** ~ **by score** *id*. xal hesabı ilə udmaq; **2.** çatmaq, yetişmək, bir təhər özünü çatdırmaq; **to** ~ **the shore** bir təhər sahilə çatmaq; **to** ~ **the mountain** *top. i* dağın zirvəsinə çatmaq, dağın zirvəsini fəth etmək; **3.** nail olmaq, əldə etmək, qazanmaq; **to** ~ **consent** razılıq əldə etmək, razılığa nail olmaq; **to** ~ ***one's*** **way** özünə yol açmaq, müvəffəqiyyət qazanmaq; **to** ~ **respect** hörmət qazanmaq; **to** ~ **confidence/ praise** inam/ tərif qazanmaq; *I can't win his friendship, though I've tried Çalışdımsa da, mən onun dostluğunu qazana bilmədim*; **to** ~ ***smb.'s*** **love** bir kəsin məhəbbətini/sevgisini qazanmaq; **4.** inandırmaq, qandırmaq, razı salmaq, öz tərəfinə çəkmək, yola gətirmək; *You have won me Sən/Siz məni inandırdın /inandırdınız*; **to** ~ ***smb.*** **(over) to** ***one's*** **cause** bir kəsi öz tərəfinə çəkmək/yola gətirmək/ usandırmaq; **5.** çıxartmaq, hasil etmək *(filiz, daş kömür və s.)*; **to** ~ **across** keçmək, aşmaq *(çayı və s.)*; **to** ~ **away (from)** qaçırtmaq, uzaqlaşdırmaq, əlindən almaq; **to** ~ **wife away from husband** arvadı ərin əlindən almaq; **to** ~ **out** bütün çətinlikləri aradan qaldırmaq, müvəffəqiyyət qazanmaq/əldə etmək; **to** ~ **over** öz tərəfinə çəkmək, …rəğbətini qazanmaq; **to** ~ **through** müvəffəq/nail olmaq; qalib /üstün gəlmək, öhdəsindən gəlmək *(çətinliyin və s.)*; **to** ~ **upon** tədricən əldə etmək/qazanmaq *(rəğbət, etimad və s.)*;
◊ **to** ~ **all hearts** hamının ürəyini ələ almaq; özünü hamıya sevdirmək, hamını özünə məftun etmək; **to** ~ **by a head** qabaqlamaq, ötmək, keçmək, dalda/arxada qoymaq *(cıdırda)*; qələbə çalmaq; **to** ~ **clear/free** güclə/zorla qurtarmaq; azad /xilas olmaq; *Lightly won, lightly gone ≅ Haynan gələn, huynan gedər*; **to** ~ **hands down** asanlıqla qalib /üstün gəlmək; **to** ~ ***one's*** **spurs** üstünlüyə/şöhrətə nail olmaq; *Either to win the horse or lose the saddle ≅ Ölmək ölməkdir, xırıldamaq nə deməkdir*

**wince**[1] [wɪns] *n* diksinmə, səksənmə; üz-gözünü qırışdırma/turşutma; qırpma *(qorxudan, ağrıdan, zərbədən, ikrahdan)*; **with a** ~ diksinərək, səksənərək; üz-gözünü turşudaraq

**wince**[2] [wɪns] *v* diksinmək, səksənmək; üz-gözünü turşutmaq, üz-gözünü qırışdırmaq *(ağrıdan)*; **to** ~ **at a blow** zərbədən qırpınmaq/səksənmək/geriyə atılmaq; *He said things that made his wife wince O elə şeylər danışdı ki, arvadı üz-gözünü turşutdu; He winced with pain as the girl stood on his injured foot Qız onun yaralı ayağını basdalayanda, o, ağrıdan üz-gözünü qırışdırdı; I still wince at the memory of the stupid things I did Mən etdiyim axmaq şeyləri yadıma saldıqca hələ də üşüdürəm*; **without** ~**ing** üz-gözünü turşutmadan, ≅ gözünü qırpmadan

**wincey** ['wɪnsɪ] *n* yarımyun yüngül parça

**winch**[1] [wɪntʃ] *n* **1.** *tex*. bucurğad *(ağırlıq qaldıran mexanizm)*; **2.** *tex*. çarx qolunu xatırladan tutacaq/ dəstək

**winch**[2] [wɪntʃ] *v* bucurğad vasitəsilə qaldırmaq *(həm də* **to** ~ **up)**

**Winchester** ['wɪntʃɪstəʳ] *n* Vinçester *(tüfəng növü; həm də* ~ **rifle)**

**wind**[1] [wɪnd] *n* I **1.** külək, yel; **strong/high** ~ güclü/möhkəm külək; **fair/favourable** ~ arxadan əsən külək, səmt küləyi; **north/south** ~ şimal/cənub küləyi; **warm** ~ isti külək; ~ **and weather** pis hava; **before/down the** ~ külək əsən istiqamətdə; **a light** ~ yüngül külək/meh; **a cold biting north** ~ adamın iliyinə işləyən soyuq şimal küləyi; *The curtains were flapping backwards and forwards in the wind Pərdələr küləkdə irəliyə-geriyə doğru yellənirdi*; **wet** ~ nəm/rütubətli külək; **into the** ~ küləyə əks istiqamətdə; *Wind falls/rises Külək yatır/qalxır*; **in the** ~**s eye, in the teeth of the** ~ düz küləyə qarşı/ küləyə əks istiqamətdə; **a gust/a blast of** ~ küləyin ani şiddəti; **like the** ~ yel kimi cəld; *He ran like the wind O, yel kimi qaçdı*; **to have the** ~ **in** ***one's*** **face 1)** küləyə qarşı getmək, üzü küləyə getmək; **2)** *məc*. çətin yolla getmək; ~ **and weather permitting** *dan*. əlverişli şəraitdə; **2.** hava axını/cərəyanı; **the** ~ **of a passing train** keçən qatarın yeli/küləyi; **3.** iy, qoxu; **to get/to catch/to have (the)** ~ **of 1)** duymaq, iylə tanımaq, iydən sezmək; *The deer got wind of the hunter Marallar ovçunun iyini sezdilər; The dogs are keeping the wind İtlər iylə /iy izi ilə gedirlər*; **2)** *məc*. şayiə, xəbər; eyham, him; *There is something in the wind Şayiələr gəzir; What's in the wind? Nə var, nə yox?* **4.** nəfəs, nəfəs alma/dərmə; *After running hard I had to stop and regain my wind Bərk qaçandan sonra mən dayanmalı və nəfəsimi dərməli oldum*; **to get/to recover** ***one's*** ~ rahat nəfəs almağa başlamaq; **to lose** ~ tövşümək, təngnəfəs olmaq, nəfəsi kəsilmək; *He has a bad wind O çətin/pis nəfəs alır*; **second** ~ *id*. özünə gəlmə, qıvraqlaşma; **5.** boş sözlər, cəfəngiyyat, boşboğazlıq, çərənçilik; *His speech was wind Onun nitqi cəfəngiyyat idi; Their arguments /promises are but (merely) wind Onların dəlilləri /vədləri cəfəngiyyatdan başqa bir şey deyil*; **6.** *tib*. yel, qaz; **7.** *tex*. körükləmə;
◊ **the four** ~**s** dünyanın cəhətləri; **from the four** ~**s** hər tərəfdən, bütün dünyadan; **to take the** ~ **out of** ***smb.'s*** **sails** ≅ bir kəsin ayağının altını qazımaq, bir kəsi çıxılmaz vəziyyətə salmaq; **to throw** ***one's*** **cares to the** ~**(s)** dərdini dağıtmaq/unutmaq; **to talk/to preach to the** ~**(s)** boş-boş/havayı danışmaq; **gone with the** ~ izsiz itmiş, əsər-əlamətsiz yox olmuş; **to hang in the** ~ tərəddüd etmək, bir qərara gələ bilməmək; qeyri-müəyyən vəziyyətdə olmaq; **to be in the** ~ bir azca sərxoş olmaq; **to get/to take** ~ məşhur olmaq, geniş yayılmaq; **to get the** ~ **of** bir şey üzərində üstünlüyə malik olmaq; **to put the** ~ **up** *sl*. qorxutmaq *(kimisə)*; **to raise the** ~ *sl*. pul qazanmaq, pul əldə etmək; **between** ~ **and water** ən zəif yer; **to catch the** ~ **in a net** ≅ boş-boş danışmaq, boşboğazlıq etmək; boş-boşuna çalışmaq; ≅ xəlbirlə su daşımaq; **to find out/to know/to see how the** ~ **blows/lies** küləyin hansı səmtdən əsdiyini bilmək /müəyyən etmək; **to scatter to the** ~**(s) 1)** bərk məğlubiyyətə uğratmaq, darmadağın etmək; **2)** sovurmaq, havaya üfürmək, puç etmək, xərcləmək *(pulu, varı və s.)*

**wind** [waınd] *n* II **1.** hörmə, burum; **out of** ~ hörüyü açılmış; **2.** dönmə, burulma, çevrilmə, əyrilik, əyri-üyrülük; döngə, dirsək; **the** ~ **of the river** çayın dirsəyi; **3.** dolama; dövr, dönmə

**wind²** [wınd] *v* I **1.** duymaq, iylə tanımaq; iyin izi ilə getmək; *The hounds winded the fox Ov tulaları tülkünün izinə düşdülər;* **2.** təngnəfəs olmaq, tövşümək; *He was quite winded by the long climb O, uzun müddət dırmaşmaqdan tamam təngnəfəs olmuşdu; He was winded by a sudden blow to the stomach Qarnına vurulan qəfil zərbədən o təngnəfəs oldu;* **3.** nəfəs dərməyə/ dincəlməyə imkan vermək; *We stopped to wind our horses Atlarımıza dinclik vermək üçün biz dayandıq;* **4.** uşağın dalına yavaşca vurmaqla qarnındakı qazı/yeli çıxartmaq *(körpədə);* **5.** havada qurutmaq; havasını dəyişmək/ təmizləmək, havaya vermək

**wind** [waınd] *v* II *(pt, pp* **wound** [waund] **1.** burulmaq, qıvrılmaq, dönmək; *The river/The path winds Çay/ Yol burulur/dönür; The river winds (its way) along a narrow valley Çay dar vadi boyunca qıvrılır/burulur;* **2.** sarımaq, dolamaq; sarınmaq, dolanmaq; *She wound her arms round the child O, qollarını uşağın boynuna doladı; Wind (up) wool into a ball Yunu yumaqla/yumaqlayın;* **to ~ thread on a reel** sapı tağalağa /makaraya dolamaq; **to ~ yarn** ipliyi yumaqlamaq; **to ~ a shawl round a baby, to ~ a baby in a shawl** uşağı şala bürümək; **to ~ a bandage round** *one's* **finger** barmağını bintlə sarımaq; **3.** sapmaq, vura-vura qaçmaq/getmək *(dovşan və s.);* **4.** qurmaq *(saatı);* işə salmaq; *If you forget to wind (up) your watch it will stop Saatını/Saatınızı qurmağı yaddan çıxartsan/ çıxartsanız, o dayanacaq; He wound up the clockwork toy O, qurulan oyuncağı işə saldı;* **5.** bucurğad/dolamaçarx vasitəsilə qaldırmaq /dartmaq; **to ~ a bucket from a well** vedrəni dolamaçarxla quyudan dartıb/çəkib çıxartmaq; **6.** hərlətmək, fırlatmaq; burmaq *(qələmi/ dəstəyi); You operate the trapdoor by winding this handle Sən /Siz bu dəstəyi hərlətməklə/burmaqla lyuku işə salırsan/ salırsınız;* **7.** əyilmək, qabarmaq *(taxta: istidən, rütubətdən);* **to ~ down 1)** *(adam haq.)* gərginliyi azaltmaq; dincəlmək, nəfəsini dərmək; *This year has been frantically busy for us – I need a month's rest to wind down Bu il biz hədsiz dərəcədə çox məşğul olmuşuq – dincəlmək üçün mənə bir aylıq istirahət lazımdır;* **2)** yavaş-yavaş işləyib dayanmaq *(divar yaxud qol saatı);* **to ~ smth. down** bir müddət təxirə salmaq; *The government has decided to wind down its nuclear programme Dövlət öz nüvə proqramını bir müddət təxirə salmağı qərara alıb;* **to ~ off** açmaq; açılmaq *(yumaq və s.);* **to ~ up 1)** sarımaq, dolamaq *(ip, yun və s.);* **2)** qurmaq *(saatı);* **3)** qızışdırmaq, özündən çıxartmaq, həyəcanlandırmaq; gərginləşdirmək; **to ~ up to fury** bərk qızışmaq/qeyzlənmək /özündən çıxmaq /hiddətlənmək; *I'm afraid he's wound up Deyəsən o bərk qızışıb/özündən çıxıb;* **4)** bitirmək, qurtarmaq; *The evening was wound up with the national anthem Axşam mərasimi milli himnlə bitdi/ qurtardı; I always said he would wind up in prison Mən həmişə deyirdim ki, o, həyatını həbsxanada başa vuracaq;* **to ~ up a meeting** iclası bağlamaq/ bitirmək; **5)** yekunlaşdırmaq *(çıxışı); It is time he wound up his speech Onun nitqini yekunlaşdırmaq vaxtıdır; If we all agree, let's wind up the discussion Hamımız razıyıqsa, gəlin bu müzakirəni yekunlaşdıraq;* **8.** ləğv etmək *(müəssisə və s.);* **to ~ up a company** kompaniyanı ləğv etmək; **to ~ up military bases on foreign territories** xarici dövlətlərin ərazisindəki hərbi bazaları ləğv etmək; **9.** gəlib çatmaq; qalmaq; *We eventually wound up (staying) in a little hotel by the sea Biz nəhayət dəniz kənarındakı balaca bir mehmanxanaya gəlib çatdıq;*

◊ **to ~ oneself** *(one's way)* **into** *smb.'s* **trust/ affection** bir kəsin qılığına girmək; **to ~** *smb.* **round** *one's* **(little) finger** bir kəsi barmağına dolamaq

**windage** ['wındıdʒ] *n* **1.** hava müqaviməti; **2.** külək sapdırması *(gülləni və s. );* **3.** gəminin suüstü hissəsi

**windbag** ['wındbæg] *n d.d.* boşboğaz, çoxdanışan, çərənçi, gəvəzə *(adam)*

**wind-bound** ['wındbaund] *adj dən.* əks tərəfdən əsən küləklər nəticəsində yubadılmış/ləngidilmiş

**wind-break** ['wındbreık] *n* **1.** sipər, qalxan *(küləkdən qorunmaq üçün);* **2.** qoruyucu meşə zolaqları *(yol boyunca və s.)*

**wind-breaker** ['wınd.breıkə'] *n* küləkburaxmayan pencək *(toxuma yaxalığı və manjeti olan)*

**wind-channel** ['wınd.tʃænl] *n av.* aerodinamik boru

**wind-cheater** ['wınd.tʃi:tə'] *n* küləkburaxmayan pencək, kurtka, başlıqlı plaş

**wind-egg** ['wınd.eg] *n* lax yumurta

**winder** ['wındə'] *n* I **1.** sarmaşan bitki; **2.** yaylı açar; quran açar; **3.** dolama pilləkənin pilləsi; **4.** *toxuc.* sarıma, dolama *(sap və s.)* maşını; **5.** *toxuc.* sarıyıcı *(fəhlə)*

**winder** ['waındə'] *n* II boruçu, boru çalan, kərənayçı

**winder** ['waındə'] *n* III *sl.* güclü zərbə

**windfall** ['wındfɔ:l] *n* **1.** küləyin yerə saldığı meyvə; ağacdan tökülən meyvə; **2.** külək/tufan yıxmış ağaclar; **3.** gözlənilməz müvəffəqiyyət, bəxti gətirmə, xüs. qəfildən irsi olaraq alınan pul; **~ profits** gözlənilməz gəlir

**windflaw** ['wındflɔ:] *n* küləyin ani şiddəti, qasırğa, boran

**wind-flower** ['wınd.flauə'] *n bot.* anemon *(qaymaqçiçəklilər fəsiləsindən bəzək bitkisi)*

**wind-ga(u)ge** ['wındgeıdʒ] *n* anemometr *(küləyin sürət və qüvvəsini və ya ventilyasiya kanallarında qazların hərəkətini təyin etmək üçün cihaz)*

**wind-hole** ['wındhoul] *n* ventilyasiya deşiyi



**windhover** ['wınd.hɔvə'] *n zool.* müşgül *(quş)*

**winding¹** ['waındıŋ] *n* **1.** dönmə, döngə, dirsək; əyrilik, bükük, əyri-üyrülük; **2.** dolama, sarıma, yumaqlama; **3.** *el.* sarğı

**winding²** ['waındıŋ] *adj* əyri-üyrü, burma, dolama, vintşəkilli, spiral, spiralşəkilli, buruq

**winding-sheet** ['waındıŋʃi:t] *n* kəfən; örtük

**wind-instrument** ['wınd.ınstrumənt] *n* nəfəsli alət

**wind-jammer** ['wınd.dʒæmə'] *n d.d.* **1.** yelkənli gəmi; **2.** boşboğaz, çərənçi, çoxdanışan; **3.** *hərb.* boruçu; kərənayçı

**windless** ['wındlıs] *adj* küləksiz; **a ~ day** küləksiz gün

**windmill** ['wındmıl] *n* **1.** yel dəyirmanı; **2.** *av. sl.* vertolyot *(həm də təyyarə);*

◊ **to fight ~s, to tilt at ~s** yel dəyirmanı ilə vuruşmaq, donkixotluq etmək; **to have ~s in** *one's* **head** xəyalpərvər olmaq; **to fling/to throw** *one's* **cap over the ~** ağılsız davranmaq, bütün hədləri ötüb keçmək *(qadın haq.)*

**window¹** ['wındou] *n* **1.** pəncərə; **to wash ~s** pəncərələri yumaq; **to look out of the ~** pəncərədən bayıra baxmaq; **to look in at the ~** pəncərədən içəri baxmaq; **2.** vitrin *(mağazada);* **to put** *smth.* **in the ~** bir şeyi vitrinə qoymaq, bir şeyi vitrində nümayiş etdirmək; **3.** *pl şair.* gözlər; **those ~s of mine** *(Shakespeare)* mənim gözlərim; gözümün nuru/işığı;

◊ **out the ~** *amer. jarq.* **1)** itmiş, itirilmiş *(şey haq.);* **2)** dağılmış, puç olmuş *(ailə, həyat haq.);* **3)** tezsatılan, işə gedən *(mal, əmtəə haq.)*

**window²** ['wındou] *adj* pəncərə; **~ recess** pəncərə taxçası; **~ shutters** pəncərə qapaqları; **~ catch /fastener** pəncərə rəzəsi/cəftəsi/sürgüsü

**window-case** ['wındoukeıs] *n* vitrin *(pəncərə sərgisi)*

**window-dresser** ['wındou.dresə'] *n* **1.** vitrini bəzəyən; **2.** malı göstərə bilmə bacarığı/məharəti; **3.** aldadan, gözdən pərdə asan, yalançı *(adam)*

**window-dressing** ['wındou.dresıŋ] *n* **1.** vitrinin bəzədilməsi; **2.** bir şeyin yaxşı tərəfini göstərə bilmə bacarığı; gözdən pərdə asma; *The company's support of scientific research is just window-dressing Kompaniyanın/Şirkətin elmi-tədqiqat işinə dəstək verməsi sadəcə olaraq gözdən pərdə asmaqdır*

**window-pane** ['wındoupeın] *n* pəncərə şüşəsi

**window-shopping** ['wındouʃɔpıŋ] *n d.d.* vitrinə qoyulmuş şeylərə baxma/tamaşa etmə *(maraq xatirinə, almaq üçün yox)*

**window-sill** ['wındousıl] *n* pəncərə altı

**windpipe** ['wındpaıp] *n anat.* nəfəs borusu

**wind-pump** ['wındpʌmp] *n* külək mühərriki ilə işləyən nasos

**windrow** ['wındrou] *n k.t.* biçilmiş taxıl, ot yaxud quru ot zolağı və s.

**wind-screen** ['wındskri:n] *n* **1.** maşının ön/qabaq şüşəsi; *Her car's wind-screen was broken Onun maşınının qabaq şüşəsi sındı;* **2.** *av.* sipər *(təyyarəçinin kabinəsində)*

**windshield** ['wındʃi:ld] *n amer.* = **wind-screen** *(1-ci mənada)*

**Windsor** ['wınzə'] *n* **1.** ucuz qaramtıl rəngli əl-üz sabunu *(həm də* **brown ~ soap, ~ soap***);* **2.** odadavamlı qırmızı kərpic

**Windsor chair** ['wınzə'tʃeə'] *n* oyma naxışlı taxta kreslo

**wind-spout** ['wındspaut] *n* tozlu fırtına, qasırğa *(sulu),* burulğan

**windstorm** ['wındstɔ:m] *n* fırtına, tufan

**wind-swept** ['wındswept] *adj* **1.** küləkdən qorunmayan, külək viran edən/dağıdan; **2.** pərişan, dağınıq *(saç haq.);* **~ hair** külək dağıtmış saç; **~ hair-do** çiyinlərinə qədər buraxılmış /tökülmüş saç

**wind-tunnel** ['wınd.tʌnl] *n* aerodinamik boru

**wind-up** ['waındʌp] *n* son, bitmə, başa çatdırma, tamamlama

**windward¹** ['wındwəd] *adj* küləkdöyən; **~ side** küləkdöyən tərəf

**windward²** ['wındwəd] *adv* külək döyən tərəfdən, küləyə doğru; külək döyən istiqamətdə

**wind-wiper** ['wındwaıpə'] *n* "dvornik" *(maşında şüşətəmizləyən)*

**windy** ['wındı] *adj* **1.** küləkli; **~ day** küləkli gün; **2.** boş, qeyri-ciddi; məzmunsuz; **~ logic** qeyri-ciddi məntiq; **~ eloquence** boşboğazlıq; gəvəzəlik, naqqallıq, lağlağılıq; **3.** uzundanışan, uzunçu; lovğa, gopçu, özünüöyən; naqqal, çərənçi, boşboğaz; **~ politician** uzundanışan/gopçu siyasətçi; **4.** *d.d.* qorxmuş; qorxan; **5.** *tib.* qarın köpündən əziyyət çəkən; **6.** *tib.* qarın köpü törədən; **~ food** qarın köpü törədən qida;

◊ **Windy City** *amer.* küləklər şəhəri *(Çikaqo haq.);* **on the ~ side** əlçatmaz yerdə; **to keep on the ~ side of the law** ələ düşməmək *(polisin, hökumətin və s.)*

**wine¹** [waın] *n* **1.** şərab, çaxır; **green /dry/sweet ~** təzə/turş/şirin şərab; **thin ~** pis şərab; **the ~ of the country** yerli şərab; **to take ~ with** *smb.* bir-birinin sağlığına qədəh qaldırmaq/ içmək; **2.** sərxoş olma, keflənmə; **in ~** sərxoş, kefli, kefli olan *(adam);* **3.** nalivka *(meyvə şirəsindən hazırlanan spirtli içki);* **currant ~** qarağat nalivkası; **4.** tünd-qırmızı rəng, qırmızı şərab rəngi;

◊ **Adam's ~** *zaraf.* su; *Good wine needs no (ivy) bush ≅ Yaxşı malın tərifə ehtiyacı yoxdur;* **to put new ~ in old bottles** təzə/yeni məzmunu köhnə formada vermək

**wine²** [waın] *v d.d.* **1.** şərab/çaxır içmək; **2.** çaxır içirtmək, şəraba qonaq etmək; **to ~ and dine** *smb.* bir kəsi yedirib-içirtmək; *We were wined and dined at the firm's expense Biz firmanın hesabına yeyib-içdik*

**winebag** ['waınbæg] *n* **1.** şərab tuluğu; **2.** *d.d.* sərxoş, kefli *(adam)*

**winebowl** ['waınboul] *n* badə; piyalə
**wine-cellar** ['waın‚selə] *n* çaxır anbarı; *He has an excellent wine-cellar Onun əla çaxır anbarı var*
**wine-coloured** ['waın‚kʌləd] *adj* tünd-qırmızı; qırmızı çaxır rəngli
**wine-cooler** ['waın‚ku:lə^r] *n* şərabı soyutmaq üçün vedrə
**wine-glass** ['waıngla:s] *n* **1.** qədəh, badə, piyalə; **2.** = **wine-glassful**
**wine-glassful** ['waıngla:sful] *n* dörd xörək qaşığı *(dərman)*
**wine-grower** ['waın‚grouə^r] *n* şərabçı, çaxırçı; üzümçü
**winepress** ['waınpres] *n* sıxma presi *(üzümü)*
**winery** ['waınərı] *n* çaxır/şərab zavodu
**wineshop** ['waınʃɔp] *n* çaxır/şərab anbarı *(balaca)*, çaxır /şərab saxlanılan zirzəmi
**wineskin** ['waınskın] *n* = **winebag** *(1-ci mənada)*
**wine-vault** ['waınvɔ:lt] *n* = **wineshop**
**wing**¹ [wıŋ] *n* **1.** qanad; **~s of birds /of insects/of airplanes/of windmills** quşların/həşəratların/ təyyarələrin/yeldəyirmanlarının qanadları; **to eat a chicken ~** çolpa qanadı yemək; **to add/to lend ~s (to) 1)** *məc.* qanadlandırmaq, ürəkləndirmək, ruhlandırmaq; *This success lends me wings Bu müvəffəqiyyət məni qanadlandırır/ruhlandırır*; **2)** tezləşdirmək, sürətləndirmək; *Fear lent him wings Qorxu onu dabanına tüpürüb qaçmağa məcbur etdi*; **2.** *hərb. id.* cinah, qanad; **left/right ~** sol/sağ qanad; **3** *mem.* fligel, evin artırması/əlavə tikilisi; *The North wing was added ten years ago Şimal artırması on il bundan əvvəl əlavə edilib*; **4.** cinah, qanad *(siyasi partiyalarda)*: **the right/the left ~ of a political party** siyasi partiyanın sağ/sol qanadı; **5.** *pl teatr.* kulis *(səhnədə yan dekorasiyalar)*; **in the ~s** kulisdə; pərdə arxasında; **to stand/to wait in the ~s 1)** səhnə arxasında öz çıxışını gözləmək *(aktyor haq.)*; **2)** öz saatını gözləmək, hazır olmaq; əlverişli anı gözləmək; **6.** *pl* sırma, nişan *(təyyarəçilərdə paltarın qolunda emblem)*; **7.** *id.* yan hücumçu *(futbolda və s.)*; **left/right ~** sol/sağ hücumçu; **to be on the ~ 1)** uçmaq; **to shoot a bird on the ~** quşu uçarkən vurmaq; **2)** *d.d.* bir yerdən başqa yerə getmək; səyahət etmək; **to take ~ 1)** uçmaq, uçub yüksəklərə qalxmaq, qanad çalmaq; **2)** *məc.* qaçmaq, əkilmək, götürülmək, daban almaq; sivişmək, yayınmaq; **on the ~s of the wind** sürətlə, küləyin qanadlarında;
◊ **grey-goose ~** ox; **to take to itself ~s** yox olmaq; aradan çıxmaq; *As soon as we go on a holiday, our money seems to take wings Biz istirahətə gedən kimi, pulumuz su kimi təbəxxür edir/yox olur*; **to take smb. under one's ~** kiminsə öz qanadı altına almaq; *She immediately took the new secretary under her wing O dərhal təzə katibi/ katibəni öz qanadı altına aldı*; **to clip one's ~s** bir kəsin qol-qanadını kəsmək; bir kəsi ruhdan salmaq; *His wings are sprouting O, göylərdə uçur/gəzir*
**wing**² [wıŋ] *v* **1.** qanadlarla təchiz etmək; **2.** *məc.* qanadlandırmaq, ruhlandırmaq, ürəkləndirmək; **3.** tələsdirmək, tezləşdirmək, sürətləndirmək; *Fear winged his steps Qorxu onu addımlarını sürətləndirməyə məcbur etdi*; **4.** ox atmaq; **5.** pərvaz etmək, uçmaq; *A bird wings the sky Quş səmada uçur/pərvaz edir; The planes winged over the Alps Təyyarələr Alp dağlarının üzərindən uçdu*; **6.** yaralamaq *(qanadı, əli)*; **to ~ a bird** quşu qanadından vurub yaralamaq; **7.** artırma artırmaq, fligel əlavə etmək *(binaya)*
**wing-beat** ['wıŋbi:t] *n* qanad çalma
**wing-case** ['wıŋ'keıs] *n* üst qanadlar *(böcəklərdə və s.)*
**wing-commander** ['wıŋkə‚ma:ndə^r] *n* aviasiya cinahının komandiri
**winged** [wıŋd] *adj* **1.** qanadlı; **2.** qanadlandırılmış, ruhlandırılmış, ürəkləndirilmiş; **3.** tez, sürətli
**wing-footed** ['wıŋ‚futıd] *adj şair.* itiayaq, ayaqdan zirək, itigedən
**wingless** ['wıŋlıs] *adj* qanadsız
**winglet** ['wıŋlıt] *n* qanadcıq
**wing-sheath** [wıŋ'ʃi:θ] *n* = **wing-case**
**wing-stroke** ['wıŋstrouk] *n* = **wing-beat**
**wink**¹ [wıŋk] *n* **1.** göz qırpma, kirpik çalma; **without a ~ of the eyelid** göz qırpmadan; **2.** göz vurma/ eləmə; **to give a ~ 1)** göz vurmaq/eləmək; **2)** *məc.* işarə etmək, eyham vurmaq, söz atmaq; *He gave me the wink that the lady was a friend of his O mənə eyham (işarə) vurdu ki, xanım onun dostudur*; **3.** dərhal, göz qırpımı; **in a ~** dərhal, bir göz qırpımında;
◊ **forty ~s** qısa yuxu, mürgü *(nahardan sonra-kı)*; **to have one's forty ~s** yuxulamaq, mürgüləmək; **not to sleep a ~, not to get a ~ of sleep** gözünü də yummamaq, gözünə yuxu getməmək, heç yatmamaq
**wink**² [wıŋk] *v* **1.** göz qırpmaq, kirpik çalmaq *(həm də* **to ~ one's eyes**); **2.** göz vurmaq/eləmək; *She winked at me O mənə göz vurdu*; **3.** sayrımaq, sayrışmaq, parıldamaq, titrək parıltı vermək *(işıq, ulduzlar və s.)*; *A lighthouse was winking in the far distance Uzaq məsafədən mayak işıq saçırdı; The driver is winking his lights, he must be turning this way Sürücü işıq siqnalı verir, güman ki, o bu yola dönəcək*; **to ~ at 1)** kiməsə göz vurmaq/eləmək; *He winked at the girl O, qıza göz vurdu/elədi*; **2)** bir şeyə göz yummaq/özünü görməməzliyə vurmaq, ört-basdır etmək; *The policeman winked at the trucks carrying the illegal supplies Polis qeyri-leqal /qanunsuz mal aparan yük maşınlarına göz yumurdu*; **to ~ at abuse/at misconduct** təqsiri/ nalayiq hərəkəti ört-basdır etmək; **to ~ away** silmək, kənar etmək; **to ~ tears away** göz yaşlarını silmək
**winkers** ['wıŋkəz] *n pl d.d.* **1.** qırpıqgöz, tez-tez göz qırpan adam; **2.** gözcük *(atda)*; **3.** *d.d.* = **winking-lights**



**winking**¹ ['wıŋkıŋ] *n* **1.** göz qırpma/vurma; **like ~** *d.d.* bir anda, göz qırpımında, göz qırpınca; **2.** mürgü, qısa(müddətli) yuxu
**winking**² ['wıŋkıŋ] *adj* **1.** sayrışan, parıldayan, parıltı verən; **2.** göz vuran, kirpik çalan
**winking lights** ['wıŋkıŋ'laıts] *n* avtoyol döngələrinin göstəricisi, manevretmə işarəsi
**winkle**¹ [wıŋkl] *n zool.* yemək üçün işlədilən dəniz ilbizi/molyusku
**winkle**² [wıŋkl] *v*: **~ out** *d.d.* qurdalayıb /eşələyib çıxartmaq; güclə/dartaraq/sıxışdıraraq çıxartmaq; *I'm sure he'd like to come for a walk with us if we can winkle him out of his study Əgər biz onu kabinetindən dartıb çıxara bilsək, mən əminəm ki, o bizimlə gəzməyə gedər*
**winner** ['wınə^r] *n* qalib, priz alan şəxs
**winning**¹ ['wınıŋ] *n* **1.** qələbə, udma; **2.** *pl* uduş, udulmuş pul; **3.** qazanma, əldə etmə *(sevgi, sədaqət) (həm də* **~ over**); **4.** çıxartma, hasil/ istehsal etmə *(kömür, daş və s.)*; **5.** yeni şaxtanın qazılması/aşkara çıxarılması
**winning**² ['wınıŋ] *adj* **1.** udan, qələbə çalan; **~ team** udan/qələbə çalan komanda; **~ number** udan/uduşa düşən nömrə; **~ stroke** həlledici zərbə; **to play a ~ game 1)** səhvsiz/sərrast oynamaq; **2)** xətasız hərəkət etmək; **2.** cəlbedici, cazibədar, məftunedici, məlahətli; **~ smile** valehedici/ məftunedici təbəssüm
**winning-post** ['wınıŋpoust] *n* finiş sütunu
**winnow**¹ ['wınou] *n* sovurucu maşın; dənsovuran maşın
**winnow**² ['wınou] *v* **1.** sovurmaq, yelə vermək *(taxılı, dəni)*; sovurub ayırmaq *(püfəni, samanı və s.) (həm də* **to ~ out/away/from**); **2.** *məc.* ələmək, xəlbirləmək, yaxşı-yamanı seçmək /ayırmaq *(həm də* **to ~ out/away**); **to ~ truth from falsehood** həqiqəti uydurmadan ayırmaq /seçmək; **to ~ candidates** namizədləri seçmək; **3.** *şair.* qanad çalmaq
**winsome** ['wınsəm] *adj* cəzbedici, cazibədar, cəlbedici, məftunedici, valehedici; **a ~ face** məftunedici sifət/üz; **~ manner** cazibədar rəftar
**winter**¹ ['wıntə^r] *n* **1.** qış; **a hard/severe/warm /mild ~** bərk/sərt/isti/mülayim qış; **green ~** qarsız qış; **in ~** qışda; **2.** *şair.* yaş *(xüs. yaşlılar haq.)*; **a man of seventy ~s** yetmiş yaşlı kişi; **~ quarters** qışlaq *(heyvanlar haq.)*
**winter**² ['wıntə^r] *adj* qış; **~ day** qış günü; **~ weather** qış havası; **~ clothes** qış paltarı; **~ frost** qış şaxtası; **~ sleep** qış yuxusu *(heyvanlarda)*
**winter**³ ['wıntə^r] *v* **1. (at, in, on)** qışlamaq; *It became fashionable to winter in Italy Qışı İtaliyada keçirmək dəb olub*; **2.** qışı başa vurmaq, qışı keçirmək *(bitkilər haq.)*; **3.** qışlatmaq, qışda saxlamaq *(heyvanı və s.)*; **4.** dondurmaq, soyutmaq
**winter-cress** ['wıntə'kres] *n bot.* turpəng *(bitki)*
**winter-crop** ['wıntəkrɔp] *n k.t.* payızlıq bitki
**winterer** ['wıntərə^r] *n* qışlaqçı, qışlayan *(adam)*
**wintering** ['wıntərıŋ] *n* **1.** qışlama, qışı qalma/ keçirmə; **2.** *k.t.* qışlaqda saxlama *(heyvanı)*
**winterize, -ise** ['wıntəraız] *v d.d.* qışa hazırlamaq, qış şəraitinə uyğunlaşdırmaq
**winterkill** ['wıntəkıl] *v amer.* qış şəraitində məhv olmaq *(bitki haq.)*
**winterly** ['wıntəlı] *adj* = **wintry**
**winter quarters** ['wıntə'kwɔ:təz] *n pl hərb.* qış ordugahı *(qoşun hissəsinin qışda yerləşdiyi yer)*
**winter sports** ['wıntə'spɔ:ts] *n pl* qış idman növləri
**winter-tide** ['wıntə'taıd] *n şair.* qış, qış vaxtı
**wintertime** ['wıntətaım] *n* qış vaxtı; *The days are shorter in (the) wintertime Qış vaxtı günlər daha qısa olur*
**wintry** ['wıntrı] *adj* **1.** soyuq, şaxtalı, qışa aid olan; **a ~ day** qış günü; **~ weather** qış havası; **2.** soyuq, kəmiltifat, fərəhsiz, kədərli, məyus *(təbəssüm, salamlaşma və s. haq.)*; **~ welcome** soyuq qəbul; **~ smile** soyuq təbəssüm; **3.** qoca, əldən düşmüş; saçı-saqqalı ağarmış
**winy** ['waını] *adj* **1.** çaxır dadı/iyi verən; **2.** sərxoş, içmiş
**wipe**¹ [waıp] *n* **1.** silmə, silib/sürtüb təmizləmə; **to give a ~** silmək; **2.** *d.d.* burun dəsmalı/yaylığı; **3.** *məc.* istehza; lağa qoyma, ələ salma; rişxənd, masqara, oynatma, sataşma, istehza etmə
**wipe**² [waıp] *v* **1.** silmək, silib/sürtüb təmizləmək, silib qurutmaq; **to ~ one's eyes** gözlərini silmək; **to ~ one's hands/tables/dishes** əllərini /stolları/ nimçələri silmək; *She wiped her hands on a tea towel O, əllərini çay dəsmalına sildi; Wipe down the kitchen door Mətbəxin qapısını silib təmizlə/ təmizləyin*; **2. (at)** *sl.* qolaylanmaq *(bir kəsə)*; qolaylanaraq vurmaq; *He wiped his stick at me O, əl ağacını mənə qolayladı*; **to ~ away** silmək, silib/sürtüb təmizləmək; **to ~ away dust** tozu silib təmizləmək; **to ~ away tears** göz yaşlarını silmək; **to ~ off 1)** silmək, təmizləmək; **to ~ off a drawing from the blackboard** çertyoju lövhədən silmək; **2)** *məc.* yox/ləğv etmək; ödəmək; **to ~ off a debt** borcu ödəmək/ləğv etmək; **to ~ out 1)** silmək, içərisini silib təmizləmək; *Can you wipe out the wine-glasses for me? Şərab şüşələrini mənim üçün silə bilərsənmi?/bilərsinizmi?*; **to ~ out a jug** bardağı silib təmizləmək; **2)** *məc.* yuyub təmizləmək, unutmaq; haqsızlığı/incikliyi aradan qaldırmaq; **to ~ out disgrace** rüsvayçılığı aradan qaldırmaq; *He has wiped out his past O öz keçmişini unudub*; **3.** məhv/yox etmək *(düşməni və s.)*: *Whole villages were wiped out in the bombing raids Bombardman basqınları bütöv kəndləri tamamilə yox etmişdi*; **to ~ up spilt milk** tökülmüş/dağıdılmış südü silmək;
◊ **to ~ smb.'s eye** *sl.* **1)** ≅ bir kəsin burnunu ovmaq; **2)** təhqir etmək, alçaltmaq *(bir kəsi)*; **to ~ the floor/the ground with smb.** bir kəsi alçalt-

maq/ özünə tabe etmək; **to ~ *smb./smth.* off the face of the earth** bir kəsi/bir şeyi yer üzündən yox etmək/ silmək; **to ~ the slate clean** hər şeyi təzədən başlamaq; köhnə səhvləri təkrar etməmək

**wiper** ['waɪpəʳ] *n* **1.** dəsmal; **2.** toz əsgisi, silmək üçün əsgi; təmizləmə qurğusu; **3.** *d.d.* burun dəsmalı, əl yaylığı; **4.** şüşə təmizləyən *(avtomobildə)*

**wire¹** [waɪəʳ] *n* **1.** məftil, sim, tel; *Cut off a length of wire Məftilin uzunluğundan kəs/kəsin; The string wasn't strong enough, so we used wire İp kifayət qədər möhkəm deyildi, odur ki, biz məftildən istifadə etdik;* **2.** teleqraf; **by ~** teleqrafla; *I'll reply by wire Mən teleqrafla cavab verəcəyəm;* **3.** *d.d.* teleqram; *Send me a wire Mənə teleqram göndər/ göndərin;*

◊ **to be on ~s** əsəbi vəziyyətdə olmaq, əsəbdən əzələləri dartılmaq, ≅ iynə üstündə oturan vəziyyətdə olmaq

**wire²** [waɪəʳ] *v* **1.** məftillə/tellə birləşdirmək; **2.** sim /tel çəkmək, elektrik xətti çəkmək

**wire-bed** ['waɪəbed] *n* yaylı çarpayı

**wire-cutter** ['waɪə.kʌtəʳ] *n* məftilkəsən qayçı

**wire-dancer** ['waɪə.da:nsəʳ] *n* kəndirbaz

**wire-drawer** ['waɪə.drɔ:əʳ] *n* məftilçi, məftilçəkən; məftilqayıran *(fəhlə)*

**wiredrawn** ['waɪədrɔ:n] *adj* **1.** çox zəif/incə *(fərq və s. haq.)*; **2.** uydurulmuş, qondarılmış, uydurma olan; süni, qeyri-təbii

**wire entanglement** ['waɪərɪn'tæŋglmənt] *n* məftil çəpər /manea

**wire-haired** ['waɪəheəd] *adj* cod, tüklü, cod/qaba tüklü *(it və s. haq.)*

**wireless¹** ['waɪəlɪs] *n* **1.** radio; **by ~** radio ilə; *I heard it on the wireless Mən onu radio verilişində eşitdim;* **2.** radioqram *(radio vasitəsilə verilən xəbər/ məlumat)*; **3.** radioqəbuledici

**wireless²** ['waɪəlɪs] *adj* **1.** simsiz, məftilsiz; **2.** radio; **~ set** radioqəbuledici cihaz; **~ fan** radioya qulaq asmağı sevən, radioya qulaq asan; **~ office** *dən.* radiorabitə məntəqəsi; **~ operator** radist, radioçu

**wireless³** ['waɪəlɪs] *v* radio ilə vermək; radioqram göndərmək

**wire mattress** ['waɪə'mætrɪs] *n* yaylı döşək

**wire netting** ['waɪə.netɪŋ] *n* zərif məftil tor

**wire-puller** ['waɪə.puləʳ] *n* bütün əlaqələri (bağları) öz əlində saxlayan şəxs; siyasi intriqan/fəsadçı

**wire-stitch** ['waɪəstɪtʃ] *v* məftillə möhkəmlətmək/ hörmək

**wire-stitcher** ['waɪə.stɪtʃəʳ] *n* məftil hörən maşın

**wire-tapping** ['waɪə.tæpɪŋ] *n* telefon danışıqlarına qulaq asma; telefon danışıqlarını tutma

**wiring** ['waɪərɪŋ] *n* **1.** elektrik şəbəkəsi, elektrik xətti çəkmə; **2.** *harb.* məftil çəpər/manea

**wiry** ['waɪərɪ] *adj* **1.** siməoxşar, elastiki; möhkəm; **2.** güclü, davamlı, dözümlü, möhkəm; **3.** cod *(saç və s. haq.)*; **4.** gur, kəskin *(səs)*; **5.** gərgin *(nəbz haq.)*

**wisdom** ['wɪzdəm] *n* **1.** müdriklik, fazillik, aqillik, alimlik; ağıllılıq; hikmət; *Years bring wisdom Müdriklik illərlə qazanılır;* **2.** sağlam fikir/düşüncə; **3.** təcrübə; **the ~ of the ages** əsrlərin təcrübəsi;

◊ *No wisdom like silence ≅ Susmaq qızıldır*

**wisdom tooth** ['wɪzdəm'tu:θ] *n* ağıl dişi;

≅ **to cut *one's* wisdom teeth** ağıllı olmaq, müdriklik yaşına çatmaq, həyat təcrübəsi əldə etmək

**wise** [waɪz] *adj* **(-r, -st) 1.** ağıllı, fərasətli, kamallı, tədbirli; müdrik; **~ policy** ağıllı/müdrik siyasət; **a ~ old man** müdrik qoca; **a ~ decision** ağıllı qərar; *The child is wise for his age Yaşına görə uşaq ağıllıdır/ fərasətlidir; You will get wiser as you get older Yaşlandıqca sən/siz kamilləşəcəksən/ kamilləşəcəksiniz;* **2.** məlumatlı, bilikli, məlumatı/ xəbəri olan; **to be /to get ~ (to)** məlumatlı olmaq, bilmək; *I am wise to you! Mən səni/sizi dişimə vurdum, Mən səni/sizi tanıdım; He came away as wise as he went O heç nə öyrənə bilmədi;* **to put *smb.* ~ to/of/ about /concerning *smth.*** bir kəsə bir şey haqqında məlumat vermək; **3.** *amer. d.d.* **1)** lovğa, təkəbbürlü; dikbaş, təşəxxüslü; həyasız, sırtıq, utanmaz; **to get ~** həyasızlıq/sırtıqlıq etmək; **to get ~ with *smb.*** bir kəslə abırsızcasına davranmaq; **2)** öz xeyrini bilən; bic, cəld, diribaş, zirək, çevik, mahir; ağlı başında; **4.** ciddi; dərin mənalı/düşüncəli; **~ look** mənalı görkəm; **to look ~** ciddi/düşüncəli görkəm almaq; **to put *smb.* ~** bir kəsi səhv yoldan qaytarmaq/xəbərdar etmək/başa salmaq/anlatmaq; **to be /to get ~ to *smth.*** bir şeydən xəbər tutmaq, bir şeyi anlamaq/başa düşmək/dərk etmək;

◊ **to be ~ after the event** ≅ *Başına gələn başmaqçı olar*

**wiseacre** ['waɪz.eɪkə] *n* = **wisehead**

**wisecrack¹** ['waɪzkræk] *n amer. d.d.* yerində edilən irad/məzəmmət; kəskin məzəmmət/sancma/iynələmə

**wisecrack²** ['waɪzkræk] *v* məzəli danışmaq, zarafatyana sözlər demək; sataşmaq, sancmaq, iynələmək

**wise guy** ['waɪzgaɪ] *n d.d.* özündən razı tip; təkəbbürlü/lovğa/sırtıq/utanmaz/abırsız/həyasız *(adam); OK, wise guy, what do we do now? Yaxşı, ay abırsız, indi biz nə edək?*

**wisehead** ['waɪzhed] *n kin.* əllamə, əlləmələk edən adam

**wise woman** ['waɪz.wumən] *n* **1.** cadugər /sehrbaz/ovsunçu/gözbağlayıcı qadın; **2.** mama, mamaça

**wish¹** [wɪʃ] *n* **1.** arzu, istək; **to have a ~ to do *smth.*** bir şey etmək arzusunda olmaq; *She expressed a wish to be alone O, tək qalmaq arzusunu/istəyini bildirdi; Good wishes! Xoş arzularla!* **2.** xahiş, təvəqqe, rica, istək, dilək; **to carry out *smb.'s* ~** bir kəsin xahişini yerinə yetirmək; **to grant /to**



**comply with *smb.'s* ~** bir kəsin diləyini yerinə yetirmək; **3.** iradə, tələb; **to disobey *smb.'s* ~es** bir kəsin iradəsi əleyhinə getmək; **by my father's ~** atamın arzusu ilə; *It's her wish that you enter O sənin/sizin içəri girməyini/ girməyinizi istəyir; It was done against my wishes Bu mənim iradəm/ arzum əleyhinə edildi; She got her wish O öz istəyinə/arzusuna nail oldu/çatdı; You'll have your wish Sən/Siz istədiyinə/ istədiyinizə nail olacaqsan/olacaqsınız;*

◊ *If wishes were horses, beggars might ride at. söz. ≅ Halva-halva deməklə ağız şirin olmaz*

**wish²** [wɪʃ] *v* **1.** istəmək, arzu etmək, öz diləyini bildirmək; *I wish you to be an actor Mən sənin/ sizin aktyor olmağını/olmağınızı diləyirəm/arzu edirəm; I wish you to understand Mən sənin/sizin başa düşməyini/düşməyinizi istəyirəm; I wish I were rich Kaş ki, dövlətli/zəngin olaydım; I wish I were a bird Kaş (ki) quş olaydım;* **2.** diləmək, arzulamaq; **to ~ *smb.* well/ill** bir kəsə yaxşılıq/ pislik arzulamaq; *I wished nobody ill Mən heç kəsə pislik arzulamamışdım; They wished us a happy journey Onlar bizə xoş/uğurlu səyahət arzuladılar; Wish me luck! Mənə uğur dilə/diləyin; His colleagues wished him happiness Onun həmkarları ona xoşbəxtlik dilədilər /arzuladılar;* **3. (for)** can atmaq; **to ~ for peace** sülhə can atmaq; *He has nothing to wish for Onun ürəyi istədiyi hər şeyi vardır;* **long ~ed for** coxdan arzu olunan; **to ~ on *d.d.*** sırımaq, zorla boynuna qoymaq, vadar etmək;

◊ **(just) as you ~** necə istəyirsən/istəyirsiniz; *We can meet at my house or yours, just as you wish Bizim evdə, yaxud sizin evdə görüşə bilərik, sən/ siz necə istəsən/istəsəniz;* **to ~ *smth.* away** başdan eləmək, rədd etmək; *These problems can't be wished away, you know Sən/Siz bilirsən/bilirsiniz ki, bu problemləri başdan eləmək olmur*

**wish-bone** ['wɪʃboun] *n* = **wishing-bone**

**-wisher** [-wɪʃəʳ] *mürəkkəb sözlərdə bir şeyi arzulayan, diləyən mənasını bildirir:* **well-wisher** xeyir arzulayan, xeyirxah *(adam)*

**wishful** ['wɪʃful] *adj* **1.** arzu olunan, istənilən, umulan; **~ thinking** arzu olunan şeyi həqiqət kimi qəbul edən; **2.** arzu edən, istəyən, ...arzusunda olan; *It's nothing but a wishful fantasy Bu, arzu olunan fantaziyadan başqa bir şey deyildir*

**wishing-bone** ['wɪʃɪŋboun] *n* çanaq, çanaq sümüyü *(quşda)*

**wish-wash** ['wɪʃwɔʃ] *n d.d.* **1.** burda *(bulanıq və dadsız içki, çay və s.)*; **2.** *məc.* boş söhbət, çərənçilik, boşboğazlıq, cəfəngiyyat

**wishy-washy** ['wɪʃɪ.wɔʃɪ] *adj d.d.* **1.** maye, duru, sulu *(yemək və s. haq.)*; horra; **~ tea** qəndsiz çay; **2.** zəif, solğun; ifadəsiz *(insan, söhbət haq.)*; **~ blue** solğun, mavi; **~ ideas** zəif fikirlər; *He's a wishy-washy liberal O, prinsipsiz liberaldır;* **3.** *arx.* xəstə, naxoş, azarlı; nasaz, tez-tez xəstələnən

**wisp** [wɪsp] *n* **1.** dəstə, dərz *(küləş, quru ot və s.)*; **2.** bir çəngə saç, saç tutamı; **a ~ of hair** bir çəngə saç; **3.** hörmə, eşmə; burma; **4.** süpürgə; **5.** çox zəif, tez keçən, yüngül, müvəqqəti, sürəksiz *(şey)*; **a ~ of a smile** güclə sezilən təbəssüm; **a ~ of smoke** yüngül tüstü axını; **a ~ of a girl** nərmənazik qız

**wispy** ['wɪspɪ] *adj* **1.** yüngül, tezkeçən, sürəksiz; **~ clouds** tezkeçən /müvəqqəti buludlar; **2.** pərişan, dağınıq; qarışıq; **~ hair** seyrək/pərişan /dağınıq saçlar

**wist** [wɪst] **to wit** *felinin pt və pp formaları*

**wistaria** [wɪs'teərɪə] *n bot.* qlisiniya *(salxımşəkilli ətirli ləçəkləri olan sarmaşan bitki)*

**wistful** ['wɪstfl] *adj* **1.** qəmli, qüssəli, kədərli; xiffət edən, qüssələnən, darıxan, kədərlənən. ...həsrətini çəkən; **~ reminiscences of her lost youth** onun itirilmiş gəncliyinin kədərli xatirələri; **2.** fikirli, düşüncəli, dalğın, həsrətli *(baxış haq.)*; **~ eyes** dalğın /fikirli gözlər; **in a ~ mood** dalğın əhvali-ruhiyyə/ ovqat

**wistfully** ['wɪstfəlɪ] *adv* qəmli, qüssəli, kədərli; fikirli; qəmli-qəmli, kədərli-kədərli, qüssəli-qüssəli, fikirli-fikirli; **~ sighing** kədərli-kədərli köks ötürmə; *"If only I had known you then", he said wistfully "Əgər mən səni/sizi onda tanımış olsaydım", o kədərli-kədərli dedi*

**wit** [wɪt] *n* **1.** *(adət. pl)* ağıl, dərrakə; idrak; fəhm, fərasət, düşüncə; *He has a quick/lively biting wit O, fərasətlidir/ dərrakəlidir/ fəhmlidir, O, kəskin idraka /ağıla malikdir; He has a slow wit O, fərasətsizdir /düşüncəsizdir/ dərrakəsizdir;* **dull ~s** korafəhmlik, kütlük, korazehinlik, fərasətsizlik; *Are you out of your wits? Ağlın/Ağlınız başındadır /başınızdadır?;* **2.** fərasət, ağıllılıq, müdriklik; *Our teacher's conversation is full of wit Bizim müəllimimizin danışığı/söhbəti çox müdrikdir;* **3.** hazırcavab/ məzəli danışan adam, məzəli adam; *He sets up for a wit O, hazırcavab adam kimi görünməyə çalışır;* **4.** hazırcavablıq;

◊ **to be at *one's* ~s' end** nə edəcəyini bilməmək, çıxılmaz vəziyyətə düşmək, başını itirmək; *I'm at my wits' end worrying about how to pay the bills Mən başımı itirmişəm, nə edəcəyimi bilmirəm, haqq-hesabı/xərci necə ödəyəcəyim haqqında təlaş keçirirəm;* **to keep /to have *one's* ~s about one** özünü/başını itirməmək, ağlı başında olmaq; **to live by *one's* ~s** çətin vəziyyətdən bir təhər çıxmaq, bir təhər başını girləmək; **out of *one's* ~s** ağlını itirmiş, dəli kimi olmuş; **to set *one's* ~ to a problem** bir məsələ üzərində baş sındırmaq, bütün fikrini/ağlını bir məsələyə yönəltmək

**witch¹** [wɪtʃ] *n* **1.** cadugər, sehrbaz; küpəgirən cadugər qarı; əcinnə; **~es' trials** cadugərlər üzərində məhkəmə prosesi; **2.** *arx.* ara həkimi, türkəçarəçi; **3.** *d.d.* ovsunçu qadın; afət; dilrüba; **4.** *amer.* fahişə, qəhbə

**witch²** [wɪtʃ] *v şair.* sehrlənmək, ovsunlamaq; məftun/ valeh etmək
**witchcraft** ['wɪtʃkra:ft] *n* cadugərlik, sehrbazlıq, cadugərlik etmə
**witch-doctor** ['wɪtʃ.dɔktəʳ] *n* ara həkimi, türkəçarəçi; falçı, sehrbaz
**witchery** ['wɪtʃərɪ] *n* 1. = **witchcraft**; 2. sehr, cadu, ovsun
**witch-hunt** ['wɪtʃhʌnt] *n* 1. *tar.* qara qüvvələrlə əlaqədə olan adamları təqib etmə; 2. mütərəqqi fikirli xadimləri təqib etmə
**witching** ['wɪtʃɪŋ] *adj şair.* füsunkar, məftunedici; **the ~ time of night** gecənin yarısı
**with¹** [wɪð] *prep* 1. *Azərbaycan türkcəsində* **-la, -lə** *şəkilçilərinə və ya* **ilə** *qoşmasına müvafiq gəlir və aşağıdakı mənaları bildirir:* 1) əlaqə, birgəlik, bərabərlik; *He came with his father O, atası ilə gəldi; I am entirely with you in this matter Bu məsələdə mən tamamilə sizinlə razıyam;* **to rise ~ the sun** sübh tezdən günəşlə birlikdə durmaq; *He bought the chairs with the table O, stulları stolla birlikdə aldı;* 2) *bir kəsin/şeyin vasitəsilə işin icra olunmasını:* **to cut ~ a knife** bıçaqla kəsmək; **to write ~ a pen** qələmlə yazmaq; **to send ~ a servant** xidmətçi vasitəsilə göndərmək; 3) *işin necə, hansı şəraitdə/vəziyyətdə cərəyan etdiyini;* **~ care** ehtiyatla; **~ thanks** ehtiramla, təşəkkürlə; *I'll do it with pleasure Mən onu məmnuniyyətlə edəcəyəm; He acted with discretion O, ehtiyatla hərəkət etdi;* 4) *bir şeyin içərisini bir şeylə doldurmanı:* **to fill a vase ~ water** vazanı su ilə doldurmaq; **to load a ship ~ coal** gəmini kömürlə yükləmək; 5) *ətrafı yaxud bir şeyin üstünü örtən materialı, şeyi: The ground was covered with snow Torpaq qarla örtülmüşdü;* **a house surrounded ~ trees** ağaclarla əhatə olunmuş ev; 6) səbəb; *Bu halda* **with** *sözönü Azərbaycan türkcəsində çıxışlıq hal şəkilçilərinə* **-dan, -dən** *uyğun gəlir:* **to die ~ pneumonia** sətəlcəmdən ölmək; **trembling ~ fear** qorxudan əsmə; **shaking ~ cold** soyuqdan tir-tir əsmə; **silent ~ shame** utancaqlıqdan susan; **a face wet ~ tears** göz yaşlarından islanmış sifət; 7) *bir kəsin/şeyin nəyə malik olduğunu /varlığını/ səciyyəvi əlamətini: Bu halda* **with** *sözönü Azərbaycan türkcəsində* **-lı, -li, -lu, -lü** *şəkilçilərinə müvafiq gəlir;* **a girl ~ blue eyes** mavi gözlü qız; **a man ~ a hat** şlyapalı adam; **a cup ~ a handle** tutacaqlı/qulplu fincan; **a coat ~ two pockets** iki cibli pencək; 8) ayrılma, ayrılıq; *I parted with her at the gate Mən ondan darvazanın yanında ayrıldım; He has broken with his best friend O ən yaxşı dostlarından ayrılıb;* 2. baxmayaraq; *With all his gifts he failed İstedadına baxmayaraq o, uğursuzluğa düçar oldu;* 3. *birləşmələrdə:* **to be honest ~ oneself** öz vicdanı qarşısında namuslu olmaq; *Be patient with them Onlarla səbirli ol/olun; Sympathize with her Ona rəğbət bəslə/bəsləyin; What is your business with him? Onunla sənin nə işin var? It's a habit with some people Bu, bəzi adamların adətidir;* **~ regard to; ~ reference to, ~ relation to, ~ respect to** əlaqədar; *I have written it with regard to your letter Mən bunu sənin/sizin məktubunla /məktubunuzla əlaqədar yazmışam;*
◊ **to be ~ child** hamilə olmaq; *Away with him! Qoy rədd olsun!* **to be/to get ~ it** *d.d.* dəblə ayaqlaşmaq
**with-** [wɪð-] *pref. Fellərə əlavə edilərək aşağıdakı mənaları ifadə edir:* 1. geri çəkilmə, dala getmə, bir kəsi/bir şeyi qoyub getmə; **to ~draw** geri/dala çəkmək; geri getmək/çəkilmək; 2. əks, qarşı; **to ~stand** qarşı durmaq, müqavimət göstərmək
**withdraw** [wɪð'drɔ:] *v (pt* **withdrew** [wɪð'dru:]; *pp* **withdrawn** [wɪð'drɔ:n]) 1. dartmaq, geri çəkmək; **to ~ one's hand** əlini geri çəkmək; **to ~ one's eyes** gözlərini kənara çəkmək; 2. geri götürmək; *Withdraw money from the bank Pulu bankdan geri götür/götürün;* **to ~ deposits** əmanətləri geri götürmək; 3. geri çəkmək/çağırmaq; çıxartmaq; **to ~ an army** qoşunu geri çəkmək; **to ~ envoys** diplomatik nümayəndələri geri çağırmaq; **to ~ a boy from school** uşağı məktəbdən götürmək /çıxartmaq; 4. getmək; uzaqlaşmaq, çəkilmək; rədd olmaq; **to ~ from society** cəmiyyətdən uzaqlaşmaq; *After dinner the ladies withdrew Nahardan sonra xanımlar başqa otağa çəkildilər; The jury withdrew Münsiflər heyəti məşvərətə getdi;* 5. çıxartmaq; **to ~ a cigarette out of one's cigarette case** papirosqabından bir papiros çıxartmaq; 6. imtina etmək, geri götürmək; **to ~ an offer/an accusation/a promise** təklifdən/ ittihamdan/vəddən imtina etmək, təklifi/vədi geri götürmək
**withdrawal** [wɪð'drɔ:əl] *n* 1. geri çəkmə, dartma; geri çəkilmə; 2. geri götürmə *(sözü, vədi, pulu və s.); He's made several withdrawals (of money) from his account recently O bu yaxınlarda öz hesabından bir qədər pul götürüb/çıxarıb;* 3. *hərb.* geri çağırma/çəkmə *(qoşunu);* **a gradual ~ of troops from the war zone** qoşunları müharibə zonasından geri çəkmə/çıxarma; 4. getmə, uzaqlaşma, çəkilmə; **~ into oneself** özünə qapanma; 5. çıxartma; 6. çəkmə *(qaz)*
**withdrawn** [wɪð'drɔ:n] *adj* adamayovuşmaz, adamdanqaçan, qaradinməz, qaradançıxmaz, qapalı *(adam haq.); He's become increasingly withdrawn since his wife's death O, arvadının ölümündən bəri adamayovuşmaz/qaradinməz olub*
**withdrew** [wɪð'dru:] **to withdraw** *felinin pt formas*ı
**wither** ['wɪðəʳ] *v* 1. **(up)** qurumaq; solmaq, qupquru qurumaq; qurutmaq, soldurmaq, puç olmaq; *The hot summer withered (up) the grass İsti yay otu qupquru qurutdu; Her hopes withered (away) Onun ümidləri puç oldu; Her beauty withered Onun gözəlliyi soldu; His right hand has withered Onun sağ əli quruyub; The flowers will wither if you don't put them in water soon Sən/Siz tezliklə gülləri suya qoymasan/ qoymasanız onlar solacaq;* 2. rəngi saralmaq, solmaq; qurumaq, çöpə dönmək *(adam haq.); Illness has withered him Xəstəlik onu çöpə döndərib /qurudub; The sun /The frost withers the plants Günəş /Şaxta bitkiləri məhv edir;* 3. azalmaq, sönmək, zəifləmək; *Her affection withered Onun sevgisi /istəyi sönüb /azalıb; Their hopes gradually withered away Onların ümidləri tədricən azaldı;* 4. *(adət. zaraf.)* canına od salmaq, yandırıb-yaxmaq; **to ~ smb. with a look** baxışla bir kəsin canına od salmaq, bir kəsi yandırıb yaxmaq
**withered** ['wɪðəd] *adj* 1. qurumuş, solmuş; **~ leaves** qurumuş yarpaqlar; 2. bürüşmüş *(alma və s. haq.);* 3. qırışmış, qırış-qırış olmuş *(dəri haq.);* 4. üzülmüş, əldən düşmüş; 5. qurumuş, iflic olmuş; **~ arm** iflic olmuş qol;
◊ **~ heart** mərhəmətsiz/sərt/amansız ürək
**withers** ['wɪðəz] *n pl* 1. süysün, cilov *(atda);* yal; 2. yüyən;
◊ *My withers are unwrung Bunun mənə dəxli yoxdur*
**withheld** [wɪð'held] **to withhold** *felinin pt, pp formaları*
**withhold** [wɪð'hould] *v (pt, pp* **withheld** [wɪð'held]) 1. imtina etmək *(bir şeydən);* çəkinmək, özünü saxlamaq, vaz keçmək *(nədənsə);* **to ~ one's consent** öz razılığını verməmək; **to ~ one's help** köməyindən imtina etmək; **to ~ one's promise** vədindən imtina etmək; **to ~ fire** *hərb.* atəş açmamaq, atəşi açmaqdan vaz keçmək; 2. dayandırmaq, çəkindirmək, saxlamaq, yubatmaq; mane olmaq; **to ~ smb. from doing smth.** bir kəsi bir şey etməkdən çəkindirmək; **to ~ payment** ödəməyi yubatmaq /ləngitmək; 3. gizlətmək, açıb deməmək; *He tried to withhold the truth from us O bizdən həqiqəti gizlətməyə çalışdı*
**within¹** [wɪ'ðɪn] *n* içəri tərəf, daxil; *The door opens from within Qapı içəri tərəfdən açılır*
**within²** [wɪ'ðɪn] *adv* 1. içəri, içəri tərəfdən, daxildən; *He whitewashed the walls within and without O, divarları içəridən və bayırdan ağartdı; Those apples are rotten within O almalar içəridən/içəri tərəfdən çürüyüb;* 2. daxildə, içəridə, evdə; *Is Tom within? Tom evdədirmi?* **to stay ~** evdə qalmaq; 3. daxilən, ruhən, fikrən: **to be pure ~** ruhən/daxilən təmiz olmaq; **to keep one's thoughts ~** öz fikirlərini gizlətmək
**within³** [wɪ'ðɪn] *prep* 1. -da, -də, içərisində, daxilində; **~ the building** binanın içərisində, evin daxilində; **~ the walls of** divarlar içərisində/ daxilində; *There are serious differences of opinion within the party Partiya içərisində/daxilində çox ciddi fikir ayrılığı mövcuddur;* **~ the country** ölkə daxilində; *The noise seems to be coming from within the building Deyəsən, səs binanın içindən gəlir;* **~ four walls** 1) dörd divar arasında; 2) əhvali-ruhiyyə, ruhi vəziyyət və s.; *Hope sprang up withing him Onun daxilində ümid qığılcımları doğdu; His heart sank within him Onun ürəyi düşdü; Despite her grief, she found a hidden strength within herself Dərdinə /Qəminə baxmayaraq, o öz daxilində gizli bir güc/qüvvə tapdı;* **~ oneself** ürəyində, qəlbində, içərisində; 2. ...dairəsində, ...da, ...də; **~ sight** görünmə dairəsində; *We are now within sight of the island Biz indi adanı görə bilirik; It is true within limits Bu, müəyyən dərəcədə doğrudur;* **to keep ~ the law** qanundan kənara çıxmamaq; 3. ...ərzində, ...müddətində; ...gec olmayaraq, ...uzaq olmayaraq; **~ an hour** bir saat müddətinə, bir saat ərzində; **~ a year** bir il müddətində; **~ a mile of the station** stansiyadan bir mil məsafədə; *If you don't hear anything within seven days, phone again Əgər yeddi gün ərzində/müddətində bir şey eşitməsən/eşitməsəniz, yenə də zəng elə/eləyin;* 4. cəmi-cümlətanı, cəmisi; *They are within a few months of the same age Onların arasında yaş fərqi cəmi-cümlətanı bir neçə aydır*
**with-it** [wɪ'ðɪt] *adj d.d.* müasir, dəbdə olan, dəbli, dəbə /modaya uyğun; **~ clothes** dəbdə olan paltar, dəbli/modalı paltar
**without¹** [wɪ'ðaut] *n* xarici/bayır tərəf, eşik; **from ~** bayırdan, eşikdən, küçədən
**without²** [wɪ'ðaut] *adv* 1. *arx.* bayırdan, xaricdən, eşikdən; *I heard footsteps without Mən bayırdan ayaq səsləri eşitdim; The house was decent enough without Ev bayırdan/bayır tərəfdən kifayət qədər gözəl idi;* 2. zahirən, xaricən, üzdən; *He was at ease without Zahirən o, sakit idi;* 3. bayıra, xaricə; o biri üzə/tərəfə; **to turn the seamy side ~** o birisi üzünə çevirmək, tərs üzünə/tərsinə çevirmək; astar tərəfinə çevirmək;
◊ *Fair without and foul within Üstü bəzək, altı təzək*
**without³** [wɪ'ðaut] *prep* 1. *Bir şeyin olmamasını bildirir və Azərbaycan türkcəsində* **-sız, -siz, -suz, -süz** *şəkilçilərinə müvafiq gəlir:* **~ money** pulsuz; **~ house** evsiz; **~ water** susuz; **~ milk** südsüz; *He cannot walk without a stick O, əl ağacı olmadan gəzə bilmir;* **two days ~ food** iki gün yeməksiz; **a skirt ~ pockets** cibsiz yubka; *They can't leave the country without a passport Onlar ölkədən pasportsuz gedə/çıxa bilməzlər;* **~ doubt** şübhəsiz; **~ end** sonsuz; **~ fear** qorxusuz; **~ hope** ümidsiz; **~ ceremony** təmtəraqsız; *They were received without ceremony Onlar təmtəraqsız qəbul edildilər;* 2. *Bir şeydən xaricdə, kənarda olmanı bildirir:* **things ~ us** xarici aləm, bizdən kənar aləm; **~ the door/the gate** qa-

pı/darvaza xaricində/ arxasında; **just ~ the trees** düz ağacların arxasında/ dalında; 3. *Hərəkətin icra olunmamasını bildirir və Azərbaycan türkcəsində* **-dan, -dən** *şəkilçilərinə müvafiq gəlir:* ~ **making mistakes** səhv etmədən; ~ **moving** hərəkət etmədən; ~ **taking leave** vidalaşmadan; ~ **breaking eggs** yumurtaları sındırmadan; *He left without saying goodbye O, sağollaşmamış çıxıb getdi; She entered the room without knocking O, qapını döymədən içəri girdi*

**withstand** [wıð'stænd] *v (pt, pp* **withstood** [wıð'stu:d]) 1. qarşı durmaq; davam/tab gətirmək; **to ~ a siege** mühasirəyə davam gətirmək; **shoes that will ~ hard wear** uzun müddət geyməyə davam gətirəcək ayaqqabılar; **to ~ an assault** hücuma/ basqına davam gətirmək; **to ~ high winds** bərk küləklərə davam gətirmək; *They withstood the enemy's attack Onlar düşmən hücumuna davam gətirdilər;* 2. *şair.* müqavimət göstərmək; dözmək; **a building that has withstood the test of time** zamanın sınaqlarından çıxmış bina

**withstood** [wıð'stud] **to withstand** *felinin pt, pp formaları*

**withy**[1] ['wıðı] *n* = **withe**[1]

**withy**[2] ['wıðı] *adj* 1. söyüd çubuğu kimi möhkəm və elastik; 2. damarlı *(adam haq.)*

**witless** ['wıtlıs] *adj* 1. beyinsiz, ağılsız, səfeh, gic, axmaq, ağlı zəif, kəmağıl *(adam haq.)*; 2. **(of)** xəbəri olmayan, heç nə bilməyən; ~ **of the crime** cinayətdən xəbəri/məlumatı olmayan

**witling** ['wıtlıŋ] *n kin.* hazırcavab/məzəli adam

**witness**[1] ['wıtnıs] *n* 1. şahid *(xüs. məhkəmədə)*; **to hear/to examine a ~** şahidi dindirmək/sorğu-sual etmək, şahidi sorğu-suala tutmaq; **to bear ~ (of, to)** şahidlik etmək, bir şeyin şahidi olmaq; **swearing of a ~** şahidin and içməsi; ~ **for the defence, for the prisoner, prisoner's ~** məhbusun şahidi; **to appear as (a) ~ for the defence** məhbusun şahidi kimi peyda olmaq/gəlmək; **false ~** yalançı/saxta şahid; 2. şahid *(bir hadisəni öz gözü ilə görmüş adam və s.)*; *God is my witness that... Allah mənə şahiddir ki,...*; **a ~ of the accident** qəzanın şahidi; 3. **(to, of)** dəlil, sübut, şəhadət; *My clothes are a witness to my poverty Paltarlarım mənim kasıb olmağımın sübutudur*

**witness**[2] ['wıtnıs] *v* 1. gözləri ilə görmək, şahid olmaq *(bir şeyə)*; *We witnessed an accident/ a murderer/a quarrel Biz qəzanın /qətlin/ davadalaşın şahidi olduq; Europe witnessed many wars Avropa çox müharibələrin şahidi olub; The retail trade is witnessing a sharp fall in sales Pərakəndə ticarət satışın kəskin şəkildə aşağı düşməsi ilə qarşılaşır;* 2. **(against, for)** şahidlik etmək, ifadə vermək *(məhkəmədə); She witnessed to having seen the man enter the building O, kişinin binaya girdiyini gördüyü haqda ifadə verdi/şahidlik etdi;* 3. təsdiq etmək *(imza və möhürlə)*; **to ~ a document/ a signature/treaty/will** sənədi/imzanı/ müqaviləni /vəsiyyəti təsdiq etmək; 4. sübut etmək, göstərmək, sübutu olmaq; *Her pale face was witnessing the agitation she felt Solğun sifəti /bənizi onun keçirdiyi həyəcanı göstərirdi*

**witness-box** ['wıtnısbɔks] *n* şahidlik kürsüsü *(məhkəmədə)*

**witness-stand** ['wıtnısstænd] *n amer.* = **witness-box**

**-witted** ['wıtıd] *mürəkkəb sözlərin tərkib hissəsi olaraq müəyyən qabiliyyətə malik olmanı bildirir:* half-**witted** ağlı zəif, kəmağıl; quick-**witted** hazırcavab, düşüncəli, fərasətli, fəhmli; dull-**witted** küt, korazehin, qanmaz, fəhmsiz

**witticism** ['wıtısızm] *n* hazırcavablıq; zarafat

**wittily** ['wıtılı] *adv* ağılla; incəliklə

**wittingly** ['wıtıŋlı] *adv* şüurlu, qəsdən, bilə-bilə

**witty** ['wıtı] *adj* 1. hazırcavab; ağıllı; fərasətli, zirək; **a ~ speaker** ağıllı spiker/natiq; 2. *arx.* bic, hiyləgər, xain, məkrli, iblis

**wive** [waıv] *v arx.* 1. evlənmək; 2. arvad almaq; 3. ərə getmək *(bir kəsə); She is wived to John Smith O, Con Smitə ərə gedib*

**wives** [waıvz] **wife** *isminin cəm forması*

**wizard**[1] ['wızəd] *n* 1. cadugər; sehrbaz, ovsunçu, falçı; **The Wizard of the North** şimal sehrbazı *(Valter Skottun ləqəbi)*; 2. qeyri-adi bacarığı/ qabiliyyəti olan adam; **technical ~** qeyri-adi texniki qabiliyyəti olan adam

**wizard**[2] ['wızəd] *adj* 1. füsunkar, məftunedici; 2. *sl.* əla, çox gözəl, dəbdəbəli, calallı, cah-calallı

**wizardry** ['wızədrı] *n* cadugərlik, sehrbazlıq, ovsunçuluq, falçılıq *(həm də məc.)*

**wizen**[1] ['wızn] *adj* = **wizened (2-ci mənada)**

**wizen**[2] ['wızn] *v* 1. solmaq, soluxmaq, ölgünləşmək *(bitki haq.)*; 2. qupquru qurumaq, qırış-qırış olmaq; ərimək *(insan haq.)*; 3. büriüşmək *(alma və s. haq.)*

**wizened** ['wıznd] *adj* 1. solmuş, rəngi qaçmış, ölgünləşmiş *(bitki haq.)*; 2. qupquru qurumuş, qırış-qırış olmuş, büriüşmüş; **a ~ old man** qupquru qurumuş qoca kişi; **an old man with a ~ face** sifəti qırış-qırış olmuş qoca kişi; ~ **apple** büriüşmüş alma

**wo** [wou] *interj.* atı dayandırmaq üçün işlədilən nida

**wobble**[1] ['wɔbl] *n* 1. yellənmə; yırğalanma; yelləmə, yırğalama; 2. *məc.* tərpənmə; titrəyiş, rəqs etmə; bulama, oynatma; 3. qabaq təkərlərin yana doğru əyilməsi *(avtomobildə)*

**wobble**[2] ['wɔbl] *v* 1. yırğalamaq, yelləmək, yellənmək, yırğalanmaq; *This table wobbles Bu stol yırğalanır/tərpənir; You're wobbling the table with your foot Sən/Siz stolu ayağınla/ayağınızla yırğalayırsan/yırğalayırsınız;* 2. səndələmək, səndələyə-səndələyə yerimək; *She came wobbling O, səndələyə-səndələyə gəldi;* 3. *məc.* tərəddüd etmək, qərarsızlıq göstərmək; *He wobbled between two opinions O, iki fikir arasında tərəddüd etdi;* 4. bulamaq, oynatmaq *(quyruğu və s.)*; 5. titrəmək, rəqs etmək *(səs, avaz haq.)*; *Her voice sometimes wobbles on high tones Bəzən onun səsi yüksək tonda titrəyir*

**wobbler** ['wɔblə'] *n* etibarsız/səbatsız adam

**wobbly** ['wɔblı] *adj* 1. laxlayan, tərpənən; səndələyən; **a ~ tooth** laxlayan diş; 2. əyri-üyrü, kələ-kötür; **a ~ line** əyri-üyrü xətt

**woe** [wou] *n şair.* 1. dərd, kədər, qəm, qüssə, ələm, hüzn, müsibət; **a tale of ~** qəmli/kədərli əhvalat; 2. *pl* bəla; **poverty, illness and other ~s** kasıblıq, xəstəlik və başqa bəlalar; **financial ~** maliyyə bəlaları; **economic ~s** iqtisadi bəlalar; ◊ *Woe be to him, Woe betide him Onu lənətə gəlsin; Woe betide anyone who arrives late! Kim gec gəlsə, görüm onu lənətə gəlsin!; Woe to the person who dares to criticise her! Onu tənqid etməyə cəsarət edən adam özündən küssün! Woe is me! Allah məni öldürsün!*

**woebegone** ['woubı.gɔn] *adj* kədərli, kədərlənmiş, qəmgin, qəmlənmiş, məyus; **a ~ child/face** kədərli uşaq /sifət

**woeful** ['woufl] *adj* 1. qəmli, çox kədərli, ələmli, qüssəli, dərdli; müsibətli, fəlakətli, bədbəxt; ~ **news** kədərli xəbər; **a ~ cry/look** ələmli/qəmli qışqırıq/ baxış; 2. çox pis, dəhşətli; ~ **ignorance** dəhşətli nadanlıq; ~ **want** dəhşətli ehtiyac

**woesome** ['wousəm] *adj* = **woeful**

**woke** [wouk] **to wake** *felinin pt, pp formaları*

**woken** ['woukən] **to wake** *felinin pp forması*

**wold** [would] *n* 1. boş/məndəcər/xam yer; 2. *coğ.* düzən, düzənlik

**wolf**[1] [wulf] *n (pl* **wolves** [wulvz]) 1. *zool.* canavar, qurd; **a pack of wolves** bir sürü canavar; **a she-~ with her cubs** dişi canavar balaları ilə; 2. qarınqulu, acgöz, doymaz; 3. *amer. d.d.* arvadbaz, qadın düşkünü; 4. qəddar, zalım adam; yırtıcı canavar; ◊ **to cry ~** yalandan həyəcan qaldırmaq; **to see /to have seen a ~** nitqi kəsilmək, danışa bilməmək, dili qurumaq, dili boğazına yapışmaq; **to keep the ~ from the door** bir təhər keçinmək, özünü bir təhər dolandırmaq; **to have the ~ in the stomach** acından ölmək, ac olmaq; **to wake a sleeping ~** ≅ yatan itin ayağını basmaq; **to have/to hold a ~ by the ears** çıxılmaz vəziyyətdə olmaq; **a ~ in a lamb's skin/in sheep's clothing** qoyun dərisi geymiş canavar; **to throw *smb.* to the wolves** bir kəsi qəddarcasına atıb çıxıb getmək

**wolf**[2] [wulf] *v* 1. acgözlüklə yemək; *He wolfed down his breakfast and rushed out O, səhər yeməyini acgözlüklə ötürdü və tez çıxıb getdi;* 2. yalançı haray qaldırmaq, yalançı həyəcan təbili çalmaq

**wolf-cub** ['wulfkʌb] *n* 1. canavar balası; 2. boyskaut *(xarici ölkələrdə: hərbi-siyasi xarakter daşıyan uşaq təşkilatı üzvü 8-10 yaş)*

**wolf-dog** ['wulfdɔg] *n* qurdbasan, canavar iti

**wolf-hound** ['wulfhaund] *n* = **wolf-dog**

**wolfish** ['wulfıʃ] *adj* heyvani, vəhşiyana, vəhşicəsinə; çox bərk/şiddətli/güclü; ~ **appetite** çox bərk/güclü iştaha

**wolfram** ['wulfrəm] *n* 1. *kim.* volfram *(çətin əriyən bərk metal)*; 2. = **wolframite**

**wolframite** ['wulfrəmaıt] *n* volframit *(tərkibində volfram olan filiz)*

**wolfskin** ['wulfskın] *n* 1. canavar dərisi; 2. canavar dərisindən tikilmiş/ikiüzlü kürk

**wolf-whistle** ['wulfwısl] *n* fit, fıştırıq *(valeh olma əlaməti olaraq gözəl qadın gördükdə)*

**wolverene** ['wulvəri:n] *n* = **wolverine**

**wolverine** ['wulvəri:n] *n* 1. *zool.* dələ, sibir porsuğu; 2. *amer. d.d.* Miçiqan ştatının sakini

**wolves** [wulvz] **wolf** *isminin cəm forması*

**woman**[1] ['wumən] *n (pl* **women** ['wımın]) 1. qadın, zənən; qadın/zənən xeylağı; **young ~** gənc/cavan qadın; **a single/ married/ divorced ~** tək/ərli/ boşanmış qadın; **~'s rights** qadın hüquqları; **the new ~** müasir qadın; **a ~ of pleasure** satqın qadın; **a ~ of the town/of the streets** küçə qadını, fahişə; **a ~ of the world** 1) həyat təcrübəli qadın, dünyagörmüş qadın; 2) kübar qadın; 2. *kin.* qorxaq, arvadxasiyyət kişi; **to play the ~** özünü arvad kimi aparmaq; 3. arvad, arvadlar, arvad cinsi; **difference between man and ~** kişi ilə qadın arasında fərq; 4. **(the ~)** qadınlıq, incəlik, qadına xas olan xasiyyət/ xüsusiyyət; 5. xidmətçi, süpürgəçi, ev təmizləyən/ yığan; **the ~ to clean the house** evi təmizləyən xidmətçi qadın; 6. aşna, məşuqə;

◊ **to play the ~** ağlamaq, qorxmaq, iradəsizlik göstərmək

**woman**[2] ['wumən] *adj* qadın; qadına aid/məxsus olan; **a ~ question** qadın məsələsi; ~ **movement** qadın hərəkatı; **a ~ doctor** qadın həkim; **a ~ artist** qadın rəssam; **a ~ student** qadın tələbə; **a ~ chaser** *amer. d.d.* arvadbaz, arvad düşkünü

**woman-hater** ['wumən.heıtə'] *n* qadınsevməz *(adam)*, qadından qaçan *(adam)*, qadın düşməni

**womanhood** ['wumənhud] *n* 1. qadın yetkinliyi; qadınlıq dövrü; *She has now grown to/reached womanhood O artıq qadın kimi yetişib, O, qadınlıq dövrünə qədəm qoyub;* 2. qadınlıq keyfiyyətləri, qadın incəliyi/zərifliyi; 3. *top.* i qadın cinsi, arvadlar, qadınlar

**womanish** ['wumənıʃ] *adj* arvadsifət, arvadaoxşar, arvadsayağı *(kişi haq.)*: *This man has a womanish manner Bu kişinin hərəkətləri arvadsayağıdır*

**womanize, -ise** ['wumənaız] *v* əxlaqsızlıq/pozğunluq etmək, pozğun həyat sürmək, oturubdurmaq *(əxlaqsız qadınlarla)*

**womanizer, -iser** ['wumənaızə'] *n* arvadbaz;

*He's a terrible womanizer O çox arvadbazdır /arvad düşkünüdür*

**womankind** ['wumən'kaınd] *n top.i* qadınlar, arvadlar, qadın cinsi; *one's* ~ ailənin arvadlardan ibarət hissəsi; **the sufferings of** ~ qadınların iztirabları

**womanlike** ['wumənlaık] *adj* arvadaoxşar, arvadsifət; qadın/arvad kimi

**womanly** ['wumənlı] *adj* qadın, qadın kimi, qadına yaraşan

**womb** [wu:m] *n* **1.** *anat.* uşaqlıq, balalıq; **2.** qarın, bətn, ana bətni; **fruit of the** ~ döl; **3.** *şair.* **1)** zülmət, qaranlıq; **through the ~ of night** gecə zülməti içərisindən; **2)** beşik; başlanğıc; **from ~ to tomb** ≅ beşikdən qəbrədək;

◊ **in earth's** ~ yerin təkində/altında; **in the ~ of time** nə zamansa, uzaq gələcəkdə; *It still lies in the womb of time Gələcək özü göstərəcək*

**wombat** ['wɔmbət] *n zool.* vombat *(ayıyaoxşar kisəli kiçik Avstraliya heyvanı)*

**women** ['wımın] **woman** *isminin cəm forması*

**womenfolk** ['wımınfouk] *n pl* qadınlar, qadın xeylaqları; *one's* ~ ailənin qadın xeylaqları; *The dead soldiers were mourned by their womenfolk Ölmüş əsgərlərin yasını onların qadın xeylaqları tutdular/saxladılar*

**won** [wʌn] **to win** *felinin pt, pp formaları*

**wonder[1]** ['wʌndə$^r$] *n* **1.** təəccüb, heyrət; *They were filled with wonder at the sight Mənzərə onları heyrətləndirdi/heyrətə gətirdi; (It's) no wonder that... Təəccüblü deyildir ki, ...; What a wonder! Necə də heyrətamizdir! What wonder? Təəccüblü nə var ki? Təəccüb etməli nə var ki? We gazed at the painting in silent wonder Biz rəsm əsərinə sakit bir heyranlıqla tamaşa etdik;* **to be struck with** ~ heyrətə düşmək, mat qalmaq, valeh olmaq *(bir şeyin gözəlliyindən, əzəmətindən və s.)*; **to look in open-mouthed** ~ ağzını açıb heyranlıqla baxmaq; **2.** möcüzə, xariqə; **to work ~s** möcüzələr yaratmaq; **the ~s of modern science** müasir elmin xariqələri/möcüzələri; *The child is a wonder Bu uşaq möcüzədir;* **the seven ~s of the ancient world** qədim dünyanın yeddi möcüzəsi; **for a** ~ qəribə də olsa; *For a wonder he paid back the money Qəribə də olsa, o, pulu ödədi; The wonder is that he found the way Qəribə budur ki, o, yolu tapdı;*

◊ **a nine-days'** ~ günün ən maraqlı/mühüm məsələsi *(gurultulu lakin tez unudulan)*

**wonder[2]** ['wʌndə$^r$] *v* **1.** təəccüblənmək, heyrətlənmək **(at)**; *I wondered at his saying that Mən onun dediklərinə/söylədiklərinə təəccüb etdim; I wonder at you! Mən səndən/sizdən bunu gözləmirdim! I wonder he did not kill you d.d. Təəccüb edirəm, o səni /sizi necə olub ki, öldürməyib;* **2.** maraqlanmaq, bilmək istəmək; *I wonder who it was Mən onun kim olmağını bilmək istəyirəm; I wonder why he is late Maraqlıdır, o niyə gecikir; I wonder whether you can tell me... Mən bilmək istəyirəm, sən/siz mənə deyə bilərsənmi/ bilərsinizmi;*

◊ *I wonder Şübhə edirəm, inanmıram, Bilmirəm, bəlkə də*

**wonder-book** ['wʌndəbuk] *n* uşaqlar üçün əyləndirici hekayələr toplusu

**wonder-child** ['wʌndətʃaıld] *n* vunderkind *(fövqəladə istedadlı uşaq)*

**wonderful** ['wʌndəfl] *adj* **1.** qəribə, əla, son dərəcə gözəl/yaxşı; ~ **weather** gözəl hava; *There is a wonderful likeness between them Onların arasında qəribə bir oxşarlıq var; What a wonderful memory she has! Onun necə də gözəl hafizəsi var!;* **2.** çox gözəl, heyrətamiz; **a ~ opportunity** çox gözəl imkan /fürsət

**wonderfully** ['wʌndəfəlı] *adv* **1.** olduqca, çox gözəl, hədsiz/son dərəcə yaxşı; ~ **happy/healthy** olduqca xoşbəxt/sağlam; **2.** qeyri-adi, qəribə, heyrətamiz; *She is wonderfully active for her age Yaşına görə o, heyrətamiz dərəcədə fəaldır*

**wonderland** ['wʌndəlænd] *n (adət. sing.)* möcüzələr adası; **Alice in** ~ Alisa möcüzələr adasında

**wonder-story** ['wʌndə'stɔ:rı] *n* sehrli nağıl

**wonder-stricken** ['wʌndə,strıkən] *adj* = **wonder-struck**

**wonder-struck** ['wʌndəstrʌk] *adj* mat qalmış, heyrətə salınmış, heyrətə düşmüş, valeh olmuş

**wonder-work** ['wʌndəwə:k] *n* möcüzə, xariqə

**wonder-worker** ['wʌndə,wə:kə$^r$] *n din.* möcüzə yaradan/ecazkar adam *(alim, həkim və s.)*

**wondrous** ['wʌndrəs] *adj şair.* ecazkar, əcaib, qəribə, çox gözəl/qəşəng; ~ **beauty** heyrətamiz /ecazkar gözəllik; **a ~ sight** ecazkar/çox gözəl mənzərə

**wonky** ['wɔŋkı] *adj sl.* **1.** laxlayan, tərpənən, etibarsız *(şey haq.)*; **a ~ chair** laxlayan stul; **2.** zəif, sısqa, arıq, cansız *(xəstəlikdən və s. sonra); She still feels a bit wonky after that attack of flu O, qrip xəstəliyindən sonra özünü hələ də bir qədər zəif hiss edir*

**wont[1]** [wount] *n* vərdiş, adət, qayda; *He rose to greet them as was his wont O onları salamlamaq üçün adəti üzrə ayağa durdu; She got up early, as was her wont Adəti üzrə o tezdən/erkən durdu*

**wont[2]** [wount] *v (pt* **wont**; *pp* **wont, wonted** [-ed] *arx.* adəti/vərdişi olmaq

**won't** [wount] *d.d.* = **will not** *birləşməsinin qısa forması*

**wonted[1]** ['wountıd] **to wont** *felinin pp forması*

**wonted[2]** ['wountıd] *adj* **1.** adət halını almış, adi; adət olunmuş/edilmiş; **2.** yeni şəraitə alışmış, öyrəncəli

**woo** [wu:] *v (pt, pp* **wooed) 1.** *zaraf.* pərəstişkarlıq etmək *(qadına)*; qız istəmək, elçi düşmək; **2.** nail/ müvəffəq olmaq, əldə etmək *(bir şeyi)*; **to ~ fame/ fortune** şərəf/var-dövlət dalınca qaçmaq, şərəfə/ var-dövlətə nail olmağa çalışmaq; **3.** öz tərəfinə çəkmək, dilə tutmaq, bir kəsin razılığını almağa nail olmaq; **to ~ smb. to compliance** bir kəsin razılığına nail olmaq; **to ~ smb. to do smth.** bir kəsi bir şey etmək üçün dilə tutmaq; **to ~ voters/clients** seçiciləri/ müştəriləri öz tərəfinə çəkmək



**wood[1]** [wud] *n* **1.** *(adət. pl)* meşə, ağaclıq; **a ~ of beech trees** fıstıqlıq, fıstıq meşəsi; **a house in the middle of a** ~ meşənin ortasında olan ev; **to go for a walk in the ~(s)** meşəyə gəzməyə getmək; **2.** oduncaq; taxta *(material)*; meşə materialı; taxta-şalban, ağac; **to prune the old ~ away** qoca ağacları budamaq; **table made of** ~ taxtadan düzəldilmiş stol, taxta stol; **3.** odun; *Put some more wood on the fire! Ocağa bir az odun at!; He chopped some wood for the fire O, ocaq üçün bir az odun doğradı/yardı;* **small** ~ çırpı; **4. (the ~)** *pl top.i* ağacdan düzəldilən nəfəsli alətlər; **5. (the ~)** çəllək, balaca çəllək *(şərab üçün)*; **wine from the** ~ boçka/çəllək şərabı/çaxırı;

◊ **to get/to be out of the** ~ çətinlikdən çıxmaq, təhlükədən sovuşmaq/qurtarmaq; *We aren't yet out of the wood Biz hələ təhlükədən/çətin vəziyyətdən qurtarmamışıq;* **to be unable to see the ~ for the trees** burnunun ucundan uzağı görməmək; **to go to the ~s** cəmiyyətdən qovulmaq

**wood[2]** [wud] *v* **1.** meşə/ağaclıq salmaq, yaşıllaşdırmaq *(bir sahəni)*; **2.** yanacaq ehtiyatı görmək, odun ehtiyatı yığmaq; **3.** odunla/taxta-şalbanla yükləmək *(gəmini)*

**wood alcohol** ['wud'ælkəhəl] *n* metil/ağac spirti

**woodbind, woodbine** ['wudbaınd, 'wudbaın] *n* **1.** *bot.* doqquzdon *(kol)*; **2.** ucuz siqaret

**wood-block** ['wudblɔk] *n* **1.** kötük; **2.** köndələninə kəsilmiş tir/dirək

**woodcock** ['wudkɔk] *n zool.* meşəcüllütü

**woodcraft** ['wudkra:ft] *n* **1.** meşə tanıma, meşədən başı çıxma; **2.** ağacdan şey düzəltmək məharəti/ sənəti

**woodcut** ['wudkʌt] *n* ağacda oymaçılıq, ağac üzərində qravüra/naxışaçma

**woodcutter** ['wud.kʌtə$^r$] *n* **1.** odunçu; **2.** oymaçı, ağac üzərində naxışaçan *(adam)*

**wood-cutting** ['wud.kʌtıŋ] *n* ksiloqrafiya *(ağac üzərində naxışaçma sənəti)*

**wooded** ['wudıd] *adj* meşəlik, ağaclıq, meşəli; ~ **terrain** meşəlik/meşəli yer

**wooden** ['wudn] *adj* **1.** taxtadan/ağacdan qayrılmış; ~ **furniture/ fences/toys** taxta mebel/çəpər/ oyuncaqlar; ~ **ware** ağac məmulatı; ~ **shoes** taxta başmaq/ayaqqabı; **2.** *məc.* hissiz, hərəkətsiz, ölüvay, küt, cansız, ölgün, süst, ruhsuz, key; ~ **smile** quru/ cansız təbəssüm; ~ **movements** ölüvay/süst hərəkətlər; *The actress gave a rather wooden performance Aktrisa çox hissiz/süst /cansız tamaşa nümayiş etdirdi;* **3.** yonulmamış, yöndəmsiz, qaba, kobud, biçimsiz;

◊ ~ **head** *d.d.* axmaq, gic, səfeh, sarsaq; kütbeyin, korazehin; ~ **horse 1)** Troya atı; **2)** *id.* tullanma eşşəyi; **3)** *tar.* işgəncə skamyası *(keçmişdə adamları bağlayıb döymək üçün xüsusi skamya)*; **4)** *sl.* dar ağacı; ~ **spoon** axırıncı yer *(yarışda)*; **to get/to take the ~ spoon** axırıncı yeri tutmaq *(yarışda)*; ~ **kimono/coat/overcoat** *amer. jarq.* tabut

**wood-engraver** ['wudın'greıvə$^r$] *n* = **woodcutter** *(2-ci mənada)*

**wooden-head** ['wudnhed] *n* taxtabaş, gic, sarsaq, səfeh

**wood-fibre** ['wud.faıbə$^r$] *n* ağac lifi

**wood-grouse** ['wudgraus] *n zool.* meşəxoruzu, teter-meşəxoruzu

**woodland[1]** ['wudlənd] *n* meşəlik, ağaclıq

**woodland[2]** ['wudlənd] *adj* meşə; ~ **scenery** meşə mənzərəsi

**woodless** ['wudlıs] *adj* meşəsiz, ağacsız

**wood-louse** ['wudlaus] *n zool.* məryəmqurdu

**woodman** ['wudmən] *n* **1.** meşəbəyi; **2.** meşəqıran, ağackəsən *(fəhlə)*; **3.** meşə sakini; **4.** *arx.* ovçu

**wood-nymph** ['wud'nımf] *n mif.* driada *(qədim yunan əfsanələrində: meşə pərisi)*

**woodpecker** ['wud.pekə$^r$] *n zool.* ağacdələn *(quş)*

**woodpigeon** ['wud.pıdʒən] *n zool.* çölgöyərçini

**woodpile** ['wudpaıl] *n* bir topa/yığın/qucaq odun

**wood-pulp** ['wudpʌlp] *n* pulpa, ağac kütləsi *(kağız hazırlamaq üçün doğranmış)*

**woodshed** ['wudʃed] *n* odun anbarı

**woodsman** ['wudzmən] *n* = **woodman**

**woodspirit** ['wud'spırıt] *n* = **woodalcohol**

**woodsy** ['wudzı] *adj amer.* meşəli

**wood-warbler** ['wud'wɔ:blə$^r$] *n zool.* ötməquşu

**woodward** ['wudwəd] *n* meşəbəyi

**wood-ware** ['wudweə$^r$] *n* taxta qab; vedrə, təknə, tabaq, çanaq

**woodwax(en)** ['wud.wæks(ən)] *n bot.* naz *(sarıçiçəkli çöl bitkisi)*

**wood-winds** ['wudwındz] *n pl top.i* nəfəsli alətlər *(ağacdan düzəldilən)*

**wood-wool** ['wudwul] *n tex.* oduncaq/qablama yonqarı

**woodwork** ['wudwə:k] *n* **1.** ağac məmulatı; **2.** tikintinin taxta-şalban hissəsi *(qapı, pəncərə çərçivəsi və s.)*

**woodworker** ['wud.wə:kə$^r$] *n* **1.** dülgər; xarrat; **2.** ağac emal edən dəzgah

**woody** ['wudı] *adj* **1.** meşəli, meşəlik; **a ~ hillside** meşəli yamac; **2.** ağac

**wooer** ['wu:ə$^r$] *n* sitayiş edən, pərəstişkar, aşiq

**woof** [wu:f] *n* **I 1.** arğac *(toxuculuqda)*; **2.** parça

**woof** [wu:f] *n* **II 1.** hürmə *(it haq.)*; **2.** *rad.* reproduktorun aşağı tonda qurulması

**woofer** ['wu:fə$^r$] *n rad.* aşağı tonlu reproduktor

**wool[1]** [wu:l] *n* **1.** yun; qoyun yunu; *These sheep are*

*specially bred for their wool Bu qoyunlar xüsusi olaraq yunlarına görə bəslənilir;* **raw ~, ~ in grease** çirkli/ yuyulmamış yun; **a ~ coat** yun pencək; **out of the ~** qırxılmış *(qoyun haq.)*; **animal ~, natural ~** təbii/xalis yun; **dyed in the ~** iplik ikən rənglənmiş; **a ball of ~** bir yumaq/kələf sap; **Berlin ~** rəngli qərus; əlvan rəngli yun toxuma ipliyi; 2. yun parça/paltar; **to wear ~** yun paltar geymək; **cloth ~** mahud; 3. pambıq *(həm də* **cotton ~***)*; **glass ~** şüşə pambıq; **mineral ~** mineral pambıq; 4. lif, tel; **willow ~** söyüd lifi; 5. *zaraf.* saç *(xüs. sıx və buruq)*;

◊ **to lose** ***one's*** **~** *d.d.* özündən çıxmaq, qəzəblənmək; **to pull the ~ over** ***smb.*'s eyes** bir kəsin gözündən pərdə asmaq; bir kəsə badalaq gəlmək; **to keep** ***one's*** **~ on** öz təmkinini saxlamaq, özündən çıxmamaq; **all ~ and a yard wide** *amer. d.d.* əsl, xalis, təmiz; əla; **to go for ~ and come home shorn** ≅ saqqal üçün gedib, bığı da qoyub gəlmək; qaş qayıran yerdə, gözünü də çıxartmaq

**wool²** [wu:l] *adj* yun; **~ yarn** yun ip; **a ~ blanket** yun yorğan; **a ~ coat** yun pencək; **~ merchant** yun taciri *(yun alveri edən)*

**woolen** ['wulən] *adj amer.* = **woollen**

**wool-gathering¹** ['wul.gæðərıŋ] *n* huşsuzluq; fikir dağınıqlığı, göylərdə uçma, xəyala qapılma; **to go/to run ~** xəyala qapılmaq, göylərdə uçmaq

**wool-gathering²** ['wul.gæðərıŋ] *adj* huşsuz, xəyala qapılan, göylərdə uçan, gözü ayağının altını görməyən *(xəyala qapıldığı üçün)*

**wool-grower** ['wul.grouə] *n* qoyunçu, qoyunçuluq mütəxəssisi

**wool-growing** ['wul.gro(u)ıŋ] *n* qoyunçuluq

**woollen¹** ['wulən] *n pl* 1. yun parça; **fancy ~** *toxuc.* dəbdə olan nazik mahud parça; 2. yun mal, yun məmulatı

**woollen²** ['wulən] *adj* yun, yundan olan; **~ cloth** yun paltar; **~ blankets** yun yorğanlar; **~ gloves** yun əlcək; **~ material** yun material

**woolly¹** ['wulı] *n d.d.* 1. toxunma yun köynək *(sviter)*; **winter wollies** qış sviterləri; 2. *pl* yun dəyişək/alt paltarı, yun tuman-köynək

**woolly²** ['wulı] *adj* 1. yunlu, yunla örtülmüş; tüklü, xovlu; **~ socks** xovlu corab; **~ hat** xovlu şlyapa; 2. qaranlıq, aydın olmayan, dolaşıq *(dəlillər, düşüncələr və s.)*; **~ mind/thinking** qarmaqarışıq /dolaşıq fikirlər/düşüncələr *(başda)*; *His ideas are a bit woolly Onun fikirləri bir az/qədər dolaşıqdır/ qarmaqarışıqdır/aydın deyildir*; 3. sıx və qıvrım *(saç haq.)*; **~ hair** sıx qıvrım saç; **~ painting** *rəs.* tutqun rənglə çəkilən şəkil; **~ voice** xırıltılı /kobud səs; 4. *amer.* kobud, yontalanmamış, mədəniyyətsiz

**woolsack** ['wulsæk] *n* 1. bir tay yun; 2. *parl.* lordlar palatasında sədrin (lord-kanslerin) oturduğu yun yastıq; 3. lord-kansler vəzifəsi; **to reach the ~** lord-kansler olmaq; **to address the ~** sədrə müraciət etmək *(Lordlar palatasında)*

**woolsey** ['wulzı] *n toxuc.* kobud yarıyun parça

**wool-skin** ['wulskın] *n* qoyun dərisi

**wool-washer** ['wul.wɔʃə] *n* yun yuyan maşın

**wool-work** ['wulwə:k] *n* qarus sapla tikmə/naxış salma

**word¹** [wə:d] *n* 1. söz, kəlam; **primary /simple/ vernacular/accessory ~** *dilç.* baş/sadə/doğma /köməkçi söz; *How do you pronounce this word? Sən/Siz bu sözü necə tələffüz edirsən?/edirsiniz? What's the French word for "dog"? "İt" sözünə fransızca nə deyirlər? Sometimes it is hard to put your feelings into words Bəzən hisslərini sözlə ifadə etmək çətin olur;* **~ for ~** sözbəsöz, hərfi; **a man of few ~s** az danışan adam, yığcam/müxtəsər danışan adam; **a man of many ~s** çoxdanışan adam, çərənçi; **by ~ of mouth** şifahi, öz sözləri ilə; **in a ~, in one ~** bir sözlə, qısası, müxtəsəri; **in a ~, no** bir sözlə yox; **to put in (to say) a ~ for** ***smb.*** bir kəs üçün ağız açmaq; bir kəs haqqında bir-iki kəlmə söz demək; **a ~ in** ***one's*** **ear** gizlincə, xəlvəti; **to take** ***smb.*** **at his ~** bir kəsi sözünün üstündə tutmaq; **on (with) the ~** sözünün dalınca; **the final/the last ~** son söz; 2. *(adət. pl)* nitq, danışıq; söz; *Can I have a word with you? Səninlə/ Sizinlə bir-iki kəlmə kəsə bilərəmmi?* **to have ~s with** ***smb.*** bir kəslə sözü olmaq/bərk dalaşmaq; **not to make ~s** danışmamaq, susmaq; **to take (up) the ~** danışmaq; sözünü kəsmək; **to put** ***one's*** **thoughts into ~s** fikrini sözlə ifadə etmək; *Words fail me Söz tapa bilmirəm; A truer word was never spoken ≅ Tamamilə doğrudur/doğru deyilib;* **bold in ~ only** təkcə söz pəhləvanıdır; **to hang on** ***smb.*'s ~s** bir kəsin sözünə diqqətlə qulaq asmaq; **to take the ~s out of** ***smb.*'s mouth** bir kəsin ağzından söz almaq/qapmaq; bir kəsin danışığını qabaqlamaq; **warm/hot ~s** söyüş, bərk savaş; **fair ~s** kompliment, xoş söz; 3. qeyd, fikir, mülahizə, rəy, məsləhət; **to say a few ~s** bir neçə qeyd etmək *(iclasda və s.-də)*; *She had the last word O, öz son sözünü dedi/qəti fikrini bildirdi, ≅ O, söz üçün məəttəl qalmadı*; 4. vəd, söz; **to give** ***one's*** **~** vəd etmək, söz vermək; **a man of his ~** sözünün ağası; *You can trust him; he's a man of his word Sən/Siz ona inana bilərsən/ bilərsiniz; o, sözünün ağasıdır; I kept my word to her Mən ona verdiyim sözün üstündə durdum;* **to be better than** ***one's*** **~** vəd edilməndən çox yerinə yetirmək; 5. xəbər, xəbər tutma, məlumat alma; **to receive ~ of** ***smb.*'s coming** bir kəsin gəlişindən xəbər tutmaq; *Please send me words as soon as possible Zəhmət olmasa mənə mümkün qədər tez xəbər/məlumat ver/verin; Word came that I was wanted at the office Xəbər gəldi ki, mən idarədə lazımam*; 6. əmr, göstəriş; **~ of command** *hərb.* fərağat əmri; **to give/to send ~** sərəncam/əmr vermək; **to say the ~** komanda vermək; *His word is law Onun sərəncamı qanundur; On the word of command/On his word they all moved forward*



*Onun əmri əsasında onların hamısı irəli hərəkət etdi*; 7. parol *(məxfi söz)*; **to give the ~** parolu demək; 8. şüar, çağırış;

◊ **a ~ and a blow** düşünülməmiş/tələm-tələsik hərəkət; **big ~s** lovğalıq, gopçuluq, özünü öymə; **beyond ~s** təsvirə gəlməz; **to swallow/to eat** ***one's*** **~s** sözlərini geri götürmək, tüpürdüyünü yalamaq; üzr istəmək; **the last ~ in/on** ***smth.*** ≅ 1) son moda; 2) son söz *(müəyyən bir sahədə)*; *The last word hasn't yet been said on this subject Bu məsələ barədə hələ son söz deyilməyib; Sharp's the word! Tez ol/olun!, Tələs, Tələsin;* **in so many ~s** tamamilə aydın, qəti/ aşkar surətdə; *He didn't say that in so many words, but that's what he meant O bunu aşkar şəkildə demədi, lakin onun demək istədiyi bu idi; Hard words break no bones at. söz. ≅ Milçək bir şey deyil, könül bulandırır; He hasn't a word to throw at a dog 1) Onun ağzından kəlbətinlə bir kəlmə də söz çəkmək olmaz; 2) O, danışmaq belə istəmir; A word spoken is past recalling at. söz. ≅ Söz quş kimidir, ağzından çıxdı geri qayıtmaz;* **a ~ to the wise** ≅ arifə bir işarə; *Upon my word! Vicdanım haqqı!*

**word²** [wə:d] *v* sözlərlə ifadə etmək, münasib sözlər seçmək; *I should word it differently Mən bunu başqa cür deyərdim; She worded the explanation well O, izahı gözəl verdi*

**word-book** ['wə:dbuk] *n* 1. lüğət; sözlük, sözlərin siyahısı; 2. libretto *(opera)*

**word-building** ['wə:dbıldıŋ] *n dilç.* söz yaradıcılığı, sözdüzəltmə

**word-class** ['wə:dkla:s] *n dilç.* nitq hissəsi/qrupu

**word-deaf** ['wə:d'def] *adj tib.* kar

**word-formation** ['wə:dfɔ:.meıʃn] *n dilç.* sözdüzəltmə

**word-hoard** ['wə:dhɔ:d] *n* söz ehtiyatı; söz zənginliyi, söz xəzinəsi

**wordily** ['wə:dılı] *adv* uzun-uzadı, uzun tərzdə

**wordiness** ['wə:dınıs] *n* çoxsözlülük

**wording** ['wə:dıŋ] *n* redaktə etmə; ifadə forması, yazılış tərzi/üslubu; *The exact wording of a legal contract can be extremely important Qanuni sazişin dəqiq redaktə olunması hədsiz dərəcədə mühüm əhəmiyyət kəsb edə bilər*

**wordless** ['wə:dlıs] *adj* 1. sözsüz; dinməz; *Her look was a wordless question Onun baxışı sözlə ifadə oluna bilməyən bir sual idi*; 2. ifadə olunmayan, sözlə ifadə edilə bilinməyən

**word-order** ['wə:d.ɔ:də] *n dilç.* söz sırası

**word-painting** ['wə:d.peıntıŋ] *n* obrazlı təsvir

**word-perfect** ['wə:d'pə:fıkt] *adj* əzbər bilən; **an actor ~ in his part** öz rolunu/partiyasını əzbərdən bilən aktyor

**word-play** ['wə:dpleı] *n* söz oyunu; kalambur, cinas

**word-splitting** ['wə:d.splıtıŋ] *n* zərif söz çalan; səfsətə, sofistika

**wordy** ['wə:dı] *adj* 1. çoxsözlü; 2. şifahi, dilcavabı

**wore** [wɔ:] **to wear** *felinin pt forması*

**work¹** [wə:k] *n* 1. iş, əmək; məşğuliyyət; **easy/hard/ well-paid ~** asan/ağır/yaxşı ödənilən iş; **piece ~** muzdlu əmək; **right to ~** əmək hüququ; **at ~** işdə, iş başında; **to be at ~ upon** ***smth.*** bir işlə məşğul olmaq; **out of ~** işsiz; **to set** ***smb.*** **to ~** bir kəsi işlətmək; **to set/to get to ~** işə başlamaq; **to set/to go about (to)** ***one's*** **~** işinə başlamaq, işindən yapışmaq; **to have** ***one's*** **~ cut out for one** çoxlu işi olmaq, işi başından aşmaq; *I have had my work cut out for me İşim başımdan aşır;* **skilled/unskilled ~** ixtisaslı/ixtisassız əmək/iş; *The pupils complained that their teacher set them too much work Şagirdlər şikayət etdilər ki, onların müəllimi onlara çox ev tapşırığı verir/onları işlə yükləyir; She put a lot of (hard) work into writing that report O, o məruzəni yazmağa çox əmək sərf etdi*; 2. hərəkət, davranış; **dirty ~** murdar hərəkət/davranış, rəzalət, alçaqlıq, əclaflıq; **bloody ~** cinayətkarlıq, qan tökmə, qırğın, canilik; **wild ~** vəhşi hərəkət/davranış; *This is the work of an enemy Bu, düşmən işidir*; 3. *pl* ictimai işlər *(həm də* **public ~s***)*; **~s of mercy** xeyriyyəçilik; **a person of good ~s** xeyriyyəçi; 4. əsər; **a ~ of art** incəsənət əsəri; **~s of Shakespeare** Şekspirin əsərləri; **a learned/a historical ~** elmi/tarixi əsər; **selected ~s** seçilmiş əsərlər; **the ~ of God** *din. şair.* Allahın xəlq etdiyi, Allahın yaratdığı *(insan haq.)*; 5. *pl* mexanizm *(xüs. saat haq.)*; *There is something wrong with the works Mexanizm işləmir/xarab olub;* **the ~s of a clock or watch** divar saatının yaxud qol saatının mexanizmi; 6. *pl* iş, əməl, hərəkət; **good ~s** 1) yaxşı işlər/ əməllər; 7. *din.* dindar/mömin əməli; **the ~s of the devil** iblis əməli, şeytan fitnəsi/fəsadı; 8. məmulat, məhsul; **chased ~** həkk edilmiş/naxış açılmış məmulat; *The villagers sell their work to the tourists Kənd sakinləri öz məhsullarını turistlərə satırlar*; 9. əl işi, tikmə, naxış tikmə; **fancy ~** bədii tikmə; *She took her work out into the garden O, əl işini götürüb bağa çıxdı; This mat is my own work Bu həsir mənim öz əl işimdir*; 10. *pl* texniki qurğu, tikinti işləri; **an engineering ~s** texniki iş, mühəndislik qurğusu; 11. *(adət. pl) hərb.* istehkam; 12. *fiz.* iş; **unit of ~** iş vahidi;

◊ **health ~** sanitariya və gigiyena; sanitar xidməti; **all in the day's ~** təbiidir, adi şeydir; **a good day's ~** ≅ düzgün iş görmə; pis işləməmə; *You did a good day's work when you bought that house O evi almaqda çox düzgün iş görmüsən/ görmüsünüz;* **at ~** işdə; *She suspected that secret influences were at work O şübhələnmişdi ki, gizli təsirlər öz işini görməkdədir;* **at ~ (on** ***smth.*****)** bir şeylə məşğul olma; *He is still at work on the painting O hələ də şəkil çəkməklə məşğuldur;* **to get (down) to/to set to ~ (on** ***smth.*****), to do** ***smth.*** başlamaq; bir kəsə hər şeyi açıb demək/söyləmək; **to give** ***smb.*** **the ~s** 1) bir

kəsə hər şeyi demək yaxud vermək; 2) bir şeyə əl gəzdirmək; *They gave the car the works and it looks like new Onlar maşına əl gəzdirdilər və o, təzə görünür*; **to make hard ~ of** ***smth.*** çətinlikləri şişirtmək/artırmaq; *It was the work of a moment to call him Onu çağırmaq bir dəqiqəlik iş idi*; **dry/thirsty ~** ağır/ çətin iş; **to make short ~ of** ***smth./smb.*** bir şeylə/ kəslə hesablaşmaq; **to make sure ~ with** ***smth.*** bir şey üzərində öz nəzarətini təmin etmək; **to get the ~s** *amer.* ≅ çətin vəziyyətə düşmək; **to give** ***smb.*** **the ~s** ≅ bir kəslə kobud davranmaq; bir kəsi istismar etmək

**work²** [wə:k] *v (pt, pp* **worked** [-t], *bir sıra mənalarda pt, pp* **wrought**) 1. işləmək, məşğul olmaq **(at)**; **to ~ like a horse /a slave** at kimi/qul kimi işləmək; **to ~ at** ***smth.*** bir şey üzərində işləmək; bir şeyi öyrənmək; **to ~ side by side with** ***smb.*** bir kəslə yanbayan işləmək, bir kəslə sıx əməkdaşlıq etmək; **to ~ towards** ***smth.*** bir şeyə imkan yaratmaq/səbəb olmaq; 2. işləmək, işi/ vəzifəsi olmaq; *He is working in a factory O, zavodda/fabrikdə işləyir; He isn't working now O indi işləmir; Most people have to work in order to live Yaşamaq üçün adamların əksəriyyəti işləməlidir; She works for/in an engineering company O, maşınqayırma kompaniyasında işləyir*; 3. hərəkətdə olmaq, işləmək, saz olmaq; *The pump will not work Nasos işləmir; The handle works freely Dəstək sərbəst işləyir; It works by electricity O, elektriklə işləyir*; 4. **(on, upon)** kömək/təsir/yardım etmək; *The medicine didn't work Dərman kömək etmədi; Did the cleaning stuff work (on that stain)? Təmizləyici maddə ləkəni aparmağa kömək etdimi? His charm doesn't work on me Onun ecazkarlığı mənə təsir etmir*; 5. qıcqırmaq, turşumaq, acımaq *(xəmir haq.)*; *The yeast began to work Maya qıcqırmağa başladı*; 6. işlətmək, işə salmaq, hərəkətə gətirmək; *Do you know how to work the lathe? Sən/Siz dəzgahı necə işlətməyi bilirsənmi?/bilirsinizmi?*; **to ~ a ship** gəmini hərəkətə gətirmək/ işə salmaq/idarə etmək; **to ~ a mine /an oil well** şaxtanı /neft quyusunu işə salmaq/işlətmək; **to ~ the land** torpağı şumlamaq; 7. öz zəhməti ilə əvəzini vermək, işləyib əvəzini çıxmaq; ödəmək, doldurmaq *(həm də* **to ~ out**); **to ~** ***one's*** **passage** paraxodda getməyin əvəzi olaraq işləmək *(matros kimi və s.)*; 8. *(həm də* **~ in/out/through**) özünə yol açmaq, soxulub/yarıb keçmək; hopmaq; *The dye works its way in fabric Rəng parçaya hopur; Rain has worked (its way) in through the roof Yağış damın/taxtapuşun içindən yarıb keçdi*; **to ~** ***one's*** **way** özünə yol açmaq, yarıb/soxulub keçmək; 9. açmaq, azad etmək, çıxartmaq *(adət.* **to ~ loose, to ~ free of**); *I was tied up, but managed to work (myself) free Mənim əlqolumu bağlamışdılar, lakin mən özümü azad edə bildim; Work the nail out of the wood Taxtadan mıxı çıxart/çıxardın*; 10. işləməyə məcbur etmək; *She works her servants too hard O, xidmətçilərini çox ağır işləməyə məcbur edir; He worked them long hours O onları uzun müddət işləməyə vadar etdi*; 11. *(pt, pp* **wrought**) törətmək, yaratmaq, səbəb olmaq; **to ~ miracles** möcüzələr/xariqələr yaratmaq; **to ~ changes** dəyişiklik yaratmaq; 12. *(pt, pp* **wrought**) becərmək, təmizləmək, düzəltmək; **to ~ the soil** torpağı becərmək; **to ~ a vein** damarı təmizləmək; 13. *(pt, pp* **wrought**) müəyyən forma vermək *(bir şeyə)*; yoğurmaq; **to ~ dough** xəmir yoğurmaq; **to ~ clay** palçıq tutmaq; **to ~ iron** dəmiri döymək *(müəyyən formaya salmaq üçün)*; 14. *(pt, pp adət.* **wrought**) süni surətdə özünü müəyyən bir vəziyyətə salmaq *(həm də* **to ~ up/into**); **to ~ oneself into a rage** özündən çıxmaq, azğınlaşmaq, bərk qəzəblənmək/hiddətlənmək; 15. naxış tikmək/çəkmək/vurmaq, toxumaq; **to ~ a design on a cushion cover** divan yastığının üstünə naxış vurmaq; **to ~ a design on linen** kətan parça üzərinə şəkil çəkmək; *She is working on a shawl /a sweater O, şal/sviter toxuyur*; 16. hesablamaq, hesablayıb tapmaq; həll etmək *(misalı, məbləği və s.)*; *The problem doesn't work out Problem həll olunmur*; 17. *d.d.* öz məqsədi üçün istifadə etmək; **to ~** ***one's*** **connections** öz əlaqələrindən məqsədi üçün istifadə etmək; 18. *d.d.* aldatmaq, fırıldaqla almaq/ qoparmaq *(pul və s.)*; *He worked the management for a ticket O, müdiriyyətdən kələklə bilet qoparmaq istədi*; **to ~ against** ***smb./smth.*** bir kəsə/bir şeyə qarşı hərəkət etmək /mübarizə aparmaq; **to ~ against poverty /against ignorance/against crime** səfalətə/nadanlığa /cinayətə qarşı mübarizə aparmaq; *He has always worked against reform O həmişə islahatın əleyhinə olub; Time is working against them Vaxt onların əleyhinə işləyir*; **to ~ away** işləməkdə davam etmək; **to ~ for** bir şeyə can atmaq/cəhd göstərmək; **to ~ for peace** sülhə can atmaq; **to ~ for the public good** ictimaiyyətin rifahı naminə çalışmaq; **to ~ in** 1) nüfuz/sirayət etmək, özünə yol açmaq; *The dust has worked in everywhere Toz hər yerə sirayət edib/ yayılıb*; 2) daxil/əlavə etmək; *Can't you work in a few jokes into your story? Sən/Siz öz hekayənə /hekayənizə bir neçə zarafat əlavə edə bilməzsən? /bilməzsiniz?*; 3) uyğun/müvafiq gəlmək; *His plans do not work in with ours Onun planları bizimki ilə uyğun gəlmir*; **to ~ off** 1) xilas olmaq, qurtarmaq; **to ~ off excess weight by regular exercise** artıq çəkidən ardıcıl məşq etməklə xilas olmaq/ qurtarmaq; 2) satmaq, satıb qurtarmaq/sovmaq; **to ~ off a lot of copies** çoxlu nüsxələr satıb qurtarmaq; 3) tökmək; **to ~ off** ***one's*** **bad temper on** ***smb.*** öz acığını bir kəsin üzərinə tökmək; 4) ödəmək, işləyib vermək *(borc və s.)*; **to ~ off a large bank loan** böyük miqdarda bank borcunu ödəmək; **to ~ on** işləməkdə davam etmək; *"Have you drawn up that list of names yet?" "No, but I'm working on it" "Sən/Siz adların siyahısını hələ tərtib etməmisənmi?/ etməmisinizmi?" "Xeyr, mən onun üzərində işləyirəm"*; **to ~ out** həll etmək; **to ~ out a problem** 1) məsələni/problemi həll etmək; 2) ibarət olmaq, təşkil etmək, ifadə olunmaq *(müəyyən rəqəm)*; *The costs work out at $ 50 Xərc 50 dollar təşkil edir; If we go by plane, it will work out rather expensive Biz təyyarə ilə getsək, o çox baha başa gələcək/baha olacaq*; 3) tükətmək, sərf etmək, sərf edib qurtarmaq; *That silver-mine is now worked out İndi bu gümüş mədənində artıq gümüş ehtiyatı qurtarıb*; 4) işləyib hazırlamaq, tutmaq *(plan)*; tərtib etmək *(sənəd)*; sitat/rəqəm və s. vermək; *I've worked out a new marketing strategy Mən yeni bazar strategiyası işləyib hazırlamışam*; 5) güclə/zorla əldə etmək, nail olmaq; *Work out your own salvation! İstiqlalına/ İstiqlalınıza nail olmağa çalış/çalışın!*; 6) real olmaq, yaxşı işlənmək, müvəffəqiyyətli olmaq; *The plan worked out Plan real oldu/reallaşdı; The plan worked out badly Plan baş tutmadı, Plan uğursuz oldu*; 7) çıxmaq, altdan çıxmaq; *Your shirt has worked out d.d. Sənin/Sizin köynəyin/ köynəyiniz altdan çıxıb (kəmərin, pencəyin və s.)*; **to ~ over** 1) üzərində təzədən işləmək/tərtib etmək; **to ~ over a document** sənədi yenidən/ təzədən tərtib etmək; 2) *sl.* bir kəsi möhkəmcə əzişdirmək; *He had been worked over by the gang because he couldn't pay Pul vermədiyinə görə quldurlar/banditlər onu möhkəmcə əzişdirdilər/ döydülər*; **to ~ round** 1) döndərmək; 2) dönmək, istiqamətini dəyişmək; *The wind has worked round Külək istiqamətini dəyişdirib*; 3) dövrə vurmaq, dolanmaq, dolanıb keçmək *(tindən və s.)*; 4) tədricən əvvəlki vəziyyətinə qayıtmaq; **to ~ up** 1) işləmək, işləyib hazırlamaq, hazır görkəm vermək; *I'm hoping to work up these notes into a book Bu qeydləri kitab şəklinə salmaq ümidindəyəm*; **to ~ up a lump of clay into a statuette** bir parça gildən heykəlcik yapmaq; **to ~ up a sketch into a picture** eskizi şəkil halına salmaq; 2) törətmək; oyatmaq, qızışdırmaq, şiddətləndirmək; təhrik etmək, qəsdən sövq etmək; **to ~ up a rebellion** qiyama təhrik etmək; **to ~ up a disturbance** iğtişaşa sövq etmək; qarmaqarışıqlığı şiddətləndirmək; **to ~ up** ***smb.*** **against** ***smb.*** bir kəsi bir kəsə qarşı qoymaq, bir kəsi başqa birisi ilə toqquşdurmaq; 3) bir kəsə təsir etmək, bir kəsi həyəcanlandırmaq; **to ~ up the feelings of an audience** camaatın hisslərinə təsir etmək, camaatı həyəcanlandırmaq; 4) qarışdırmaq *(tərkib hissələri)*; 5) məlumat toplamaq *(müəyyən bir məsələ üzrə)*; 6) qazanmaq, nail olmaq, əldə etmək; **to ~ up a reputation** nüfuz/hörmət qazanmaq; *What are you working up to? Sən/Siz nəyə nail olmağa çalışırsan?/çalışırsınız?*; **to ~ upon** ***smb.'s*** **conscience** bir kəsin vicdanına təsir etmək;

◊ **to ~** ***one's*** **will** öz bildiyi kimi/istədiyi kimi hərəkət etmək, istədiyinə nail olmaq; **to ~** ***one's*** **will upon** ***smb.*** başqasını iradəsinə tabe etmək; **to ~ against time** müəyyən vaxta qədər qurtarmağa cəhd etmək; *It won't work* ≅ *Bu nömrə keçməz, Belə olmaz*; **to ~ up to the curtain** *teatr.* səhnə arxasında/kulisdə məşğul olmaq

**workability** [ˌwə:kəˈbılıtı] *n* yararlı olma, münasiblik, lazımlılıq *(emal və s.)*; tətbiq edilə /işlədilə bilmə, kara gəlmə

**workable** [ˈwə:kəbl] *adj* 1. rentabelli, yararlı; *This plan simply isn't workable Bu plan sadəcə olaraq rentabelli/yararlı deyil*; 2. icra olunan, yerinə yetirilə bilən, real

**workaday** [ˈwə:kədeı] *adj* adi, gündəlik, hərgünkü; **~ clothes** gündəlik paltar; **simple ~ food** adi /gündəlik yemək

**workaway** [ˈwə:kəˌweı] *n* öz gediş haqqının əvəzini işləyib çıxan adam *(xüs. paraxodda)*

**work-bag** [ˈwə:kbæg] *n* 1. fəhlə, əl çantası; 2. əl işi alətləri üçün çanta *(torbacıq)*

**work-basket** [ˈwə:kˌba:skıt] *n* əl işləri üçün zənbil *(sap, iynə və s. qoyulan)*

**work-book** [ˈwə:kbuk] *n* 1. konspekt, icmal *(mühazirə və s.)*; 2. görülmüş işləri qeyd etmə dəftəri; 3. tapşırıqlar məcmuəsi *(kitabça)*

**work-box** [ˈwə:kbɔks] *n* = **work-basket**

**workday** [ˈwə:kdeı] *n* 1. iş günü; *Saturday is a workday for him Şənbə onun iş günüdür*; 2. *pl* adi günlər; adi həyat, adi iş günləri

**worker** [ˈwə:kəʳ] *n* 1. fəhlə; işçi; **factory/office ~** fabrik /idarə fəhləsi/işçisi; **~s and peasants** fəhlələr və kəndlilər; 2. işçi; həmkar; **good/bad/ diligent/ efficient ~** yaxşı/pis/çalışqan/bilikli işçi; **library/ school ~s** kitabxana/məktəb işçiləri; **X-ray ~** rentgenoloq; 3. zəhmətkeş, çalışqan/işlək adam; **~s of evil** canilər, cinayətkarlar; **~s of miracles** möcüzə yaradanlar

**worker-bee** [ˈwə:kəbi:] *n* işlək arı

**workhouse** [ˈwə:khaus] *n* 1. *tar.* muzdur evi; 2. *amer.* islahedici dustaqxana/əmək düşərgəsi

**working¹** [ˈwə:kıŋ] *n* 1. iş, hərəkət, fəaliyyət; **the ~s of the mind** əqli fəaliyyət; **the ~s of conscience** vicdanın səsi/hərəkətə gəlməsi; 2. istismar; istehsal, istehsal etmə, çıxartma; 3. emal etmə

**working²** [ˈwə:kıŋ] *adj* 1. işləyən; **a ~ woman /man** işləyən qadın/kişi; 2. iş; **~ hours** iş saatları; 3. istismara/işə/işlətməyə yarayan; **~ conditions** *tex.* iş/əmək şəraiti; *Working conditions in the industry have improved greatly Sənayedə iş şəraiti xeyli yaxşılaşıb*; **~ efficiency** əmək məhsuldarlığı

**working capital** [ˈwə:kıŋˈkæpıtl] *n* tədavüldə olan kapital, dövriyyə kapitalı

**working-class¹** [ˈwə:kıŋˈkla:s] *n* fəhlə sinfi; *She comes from a working-class background Onun əsli/mənşəyi fəhlə sinfindəndir*

**working-class²** [ˈwə:kıŋˈkla:s] *adj* fəhlə sinfi.

fəhlə sinfinə aid olan; ~ **solidarity** fəhlə sinfinin həmrəyliyi

**working-day** [ˈwɜ:kɪŋdeɪ] *n* = **work-day**

**working-man** [ˈwɜ:kɪŋmæn] *n (pl* **-men** [-men] fəhlə, qulluqçu *(sənayedə)*

**working-out** [ˈwɜ:kɪŋˈaut] *n* **1.** bütün təfərrüatı ilə işləyib hazırlama *(plan və s. haq.)*; **2.** hesab, hesablama; yekun

**workless** [ˈwɜ:klɪs] *adj* işsiz; **a ~ man** işsiz adam

**workman** [ˈwɜ:kmən] *n (pl* **-men** [-men]) **1.** fəhlə *(xüs. ixtisaslı)*; **2.** muzdla işləyən fəhlə; **3.** işçi; **a good ~** işinin ustası;

◊ *A bad workman quarrels with his tools ≅ Pis usta günahı alətində görür*

**work-out** [ˈwɜ:kˈaut] *n amer.* **1.** *d.d.* sınaq müddəti; **2.** *id.* məşq

**works** [wɜ:ks] *n pl (həm tək, həm də cəmdə işlənir)* zavod

**workshop** [ˈwɜ:kʃɔp] *n* **1.** emalatxana; sex; **2.** bölmə, simpozium; seminar, dərnək; **3.** *teatr.* studiya

**work-shy** [ˈwɜ:kʃaɪ] *n* tənbəl/avara/işdən boyun qaçıran adam

**work-table** [ˈwɜ:k.teɪbl] *n* iş stolu, əl işləri (tikmə) stolu

**workweek** [ˈwɜ:kwi:k] *n* iş həftəsi

**workwoman** [ˈwɜ:k.wumən] *n (pl* **-women** [-.wɪmɪn]) işçi /qulluqçu qadın

**work-worn** [ˈwɜ:kwɔ:n] *adj* çox yorğun, ağır işdən əldən/gücdən düşmüş; yorulmuş, tabsız

**world**[1] [wɜ:ld] *n* **1.** dünya, aləm; kainat; **the whole ~** bütün dünya/aləm; **the external ~** *fəls.* xarici aləm; **to bring into the ~** dünyaya gətirmək, doğmaq; **to come into the ~** doğulmaq, dünyaya gəlmək; **the ~ at large** bütün dünya/aləm; **the ~ over** dünyada, aləmdə, bütün dünyada/aləmdə; **a journey round the ~** dövraləm səyahəti; **the rivers and oceans of the ~** dünyanın çayları və okeanları; **2.** cəmiyyət; **the great ~** kübar cəmiyyət; *He lives out of the world O, cəmiyyətdən uzaq/kənar yaşayır; What will the world say? Cəmiyyət nə deyər?*; **3.** müəyyən fəaliyyət dairəsi, aləm; **the ~ of letters** ədəbi aləm; **the ~ of sport** idman aləmi; **the ~ of books/of art/of music** kitablar/incəsənət/musiqi aləmi; **scientific ~** elmi aləm, elm aləmi; **the animal /insect/vegetable ~** heyvanat/həşərat/bitki aləmi; **4.** dünyagörüşü, həyata baxış; *His world is very narrow Onun dünyagörüşü/həyata baxışı çox məhduddur*; **5.** *d.d.* çoxlu, bir yığın/topa/qalaq; *He has had a world of troubles Onun bir yığın qayğısı, işi-gücü vardır*; **a ~ of faults** çoxlu çatışmamazlıq/ qüsur; **a ~ of money** bir topa/çoxlu pul; **6.** başqa planetlər; *There may be other worlds out there Bizdən xaricdə başqa planetlər də ola bilər*; **7.** *Qüvvətləndirmə məqsədilə işlənir və bu halda Azərbaycan türkcəsinə tərcümə olunmur: What in the world does he mean? Axı o nə (demək) istəyir? I don't know what in the world to do with it? Heç bilmirəm onunla nə edim?; Tired to the world Hədsiz yorğunam/yorğunluqdan ölürəm*; **a ~ too** hədsiz, çox, həddindən artıq, olduqca, dedikcə; **8.** *din.* dünya, aləm; axirət; **the other /the next ~** axirət dünyası; **this ~** bu dünya; **the Old World** köhnə dünya *(Avropa, Asiya, Afrika)*; **the New World** yeni dünya *(Amerika)*;

◊ **to begin the ~** yeni həyata qədəm qoymaq; **not for the ~** heç bir vəchlə, heç cür, heç bir vaxt, qətiyyən, əsla; **not of this ~** ≅ bu dünyadan/bu dünya adamı olmayan; *He would give the world to know that O onu bilmək üçün bütün dünyanı verərdi*; **to think the ~ of *smb.*** bir kəs haqqında çox yüksək fikirdə olmaq; **~ without end** ömürlük; **all the ~ and his wife 1)** istisnasız olaraq hamı; **2)** bütün kübar cəmiyyət; **for all the ~ like** hər cəhətdən oxşar; *How goes the world with you? İşlərin/İşləriniz necə gedir?*; **to know the ~** həyat təcrübəsi olmaq; **the lower ~** cəhənnəm; **to the ~** *sl.* son dərəcə, tamamilə; **drunk to the ~** bərk/dəhşətli dərəcədə sərxoş; *So goes (wags) the world Həyat belədir*; **to come down in the ~** düşmək, düşkünləşmək, əvvəlki vəziyyətini itirmək; **to come up/to rise in the ~** mənsəbə çatmaq; **out of this ~** *d.d.* əla, çox gözəl; **to carry the ~ before one** həyatda hər şeyə nail olmaq

**world**[2] [wɜ:ld] *adj* dünya; **~ problems** dünya problemləri; **~ market** dünya bazarı; **~ trade** dünya ticarəti; **~ outlook/view** dünyagörüşü, dünyabaxışı

**world-famous** [ˈwɜ:ldˈfeɪməs] *adj* dünya şöhrətli; *His books are world-famous Onun kitabları dünyada məşhurdur*

**world-history** [ˈwɜ:ldhɪstərɪ] *n* dünya tarixi

**worldling** [ˈwɜ:ldlɪŋ] *n* dünya işlərinə başı qarışmış adam

**worldly** [ˈwɜ:ldlɪ] *adj* **1.** dünyəvi; **~ goods** mülk, əmlak, var, var-dövlət; **~ pleasures** dünyəvi ləzzət/ həzz; **2.** həyat nemətlərini sevən, rifahı sevən; **3.** təcrübəli, bacarıqlı, məharətli; **~ wisdom** həyat müdrikliyi, praktik ağıl; *He is a child in world matters Həyati işlərdə o, uşaqdır*

**worldly-minded** [ˈwɜ:ldlɪˈmaɪndɪd] *adj* dünya işlərinə aludə olan/başı qarışan

**worldly-wise** [ˈwɜ:ldlɪˈwaɪz] *adj* təcrübəli, məharətli, çoxgörmüş, bişkin, oddan-alovdan keçmiş/çıxmış

**world-old** [ˈwɜ:ldˈould] *adj* dünyagörmüş qoca

**world-policy** [.wɜ:ldˈpɔlɪsɪ] *n* dünya siyasəti

**world-power** [ˈwɜ:ld.pauəʳ] *n* önəmli/güclü dövlət

**world series** [ˈwɜ:ldˈsɪəri:z] *n pl amer.* beysbol üzrə ABŞ-ın illik yarışı



**world war** [ˈwɜ:ldˈwɔ:] *n* dünya müharibəsi; **World War I** birinci dünya müharibəsi; **World War II** ikinci dünya müharibəsi

**world-weary** [ˈwɜ:ldˈwɪərɪ] *adj* həyatdan yorulmuş/ bezikmiş/çiyrənmiş, həyata inamını itirən

**world-wide** [ˈwɜ:ldwaɪd] *adj* bütün aləmə yayılmış; dünyada tanınmış; **~ fame** dünya şöhrəti, dünyada tanınma; **on a ~ scale** ümumdünya miqyasında; **~ organization** ümumdünya təşkilatı; **~ support** ümumdünya köməyi

**worm**[1] [wɜ:m] *n* **1.** *zool.* qurd, soxulcan; **birds looking for ~s** qurd axtaran quşlar; **2.** *zool.* kəpənək qurdu; qumquma; sürfə; **3.** *zool.* bağırsaq qurdu; *The dog/The child has worms İtdə/Uşaqda bağırsaq qurdu vardır/olur*; **4.** qurd *(meyvədə və s.)*; *The apples are full of worms Almalar qurdludurlar/ qurdla doludurlar*; **5.** alçaq adam, nifrətə layiq şəxsiyyət; yaramaz qurd; **a poor ~ like him** onun kimi yaramaz adam; **6.** *tex.* trapesiya şəklində yivi olan vint;

◊ **to be food/meat for ~s** qəbir qurdlarına yem olmaq; **the ~ of conscience** vicdan əzabı; *I am a worm today Mən bu gün özümdə deyiləm*; **to have a ~ in *one's* tongue** donquldanmaq, deyinmək, mırtıldamaq, söylənmək; *Even a worm will turn ≅ Ən həlim adamın da səbr kasası daşır*

**worm**[2] [wɜ:m] *v* **1.** sürünmək, sürünə-sürünə getmək, gizlicə girmək/keçmək; *He wormed his way (himself) through the bushes O, kolların arasından gizlicə keçdi*; **2.** girmək, soxulmaq; özünü gözə soxmaq, qılığa girmək; **to ~ oneself into *smb.'s* confidence** bir kəsin qılığına girmək/etimadını qazanmaq; **3.** söz almaq, sirr almaq; öyrənmək, soruşub bilmək; **to ~ a secret out of *smb.*** bir kəsdən sirri öyrənmək; **4.** qurdu tökmək; *All horses should be regularly wormed Müntəzəm olaraq atların qurdunu tökmək lazımdır*

**worm-eaten** [ˈwɜ:m.i:tn] *adj* **1.** qurd yemiş/dəymiş; **2.** *məc.* köhnəlmiş; kiflənmiş, cəng atmış

**worm-fishing** [ˈwɜ:m.fɪʃɪŋ] *n* qurdla balıq tutma

**worm-hole** [ˈwɜ:mhoul] *n* zədə, qurd yemiş/qurd dəymiş yer

**wormseed** [ˈwɜ:msi:d] *n bot.* yovşan

**worm-wheel** [ˈwɜ:mwi:l] *n tex.* vintli çarx

**wormwood**[1] [ˈwɜ:mwud] *n* **1.** *bot.* acı yovşan; **2.** *məc.* acı dağ/ələm/kədər, kədər mənbəyi; *The thought was wormwood to him Bu fikir ona dağ oldu*

**wormwood**[2] [ˈwɜ:mwud] *adj* yovşan; **~ beer** yovşan pivəsi

**wormy** [ˈwɜ:mɪ] *adj* **1.** qurdlu *(meyvə haq.)*; **2.** alçaq, əclaf, rəzil

**worn** [wɔ:n] **to wear** *felinin pp forması*

**worn-out** [ˈwɔ:nˈaut] *adj* **1.** geyilmiş, dağılmış, yırtılmış, köhnə, nimdaş; **~ clothes** geyilmiş/nimdaş paltar; **~ rope** köhnə kəndir/ip; **2.** *məc.* çeynənmiş, qeyri-orijinal *(zarafat haq.)*; **a ~ joke** çeynənmiş zarafat; **3.** çox yorğun, əldən düşmüş; *He looked worn-out O, çox yorğun görsəndi*

**worrier** [ˈwʌrɪəʳ] *n* **1.** narahat adam; **2.** sərt/yaman it; **3.** zülmkar, zalım, əzab sevən

**worrisome** [ˈwʌrɪsəm] *adj* **1.** narahat, rahatsız, aramsız; həyəcanlı, iztirablı; **2.** vasvası, bədgüman; **3.** narahatlıq doğuran; zəhlətökən, təngə gətirən, bezikdirən, usandıran, qarayaxa

**worry**[1] [ˈwʌrɪ] *n* **1.** narahatlıq; iztirab; tələş; nigaranlıq, təşviş, həyəcan, əziyyət; *His parents were frantic with worry Onun valideynləri nigarançılıqdan dəli-divanə oldular; Worry and illness had made him prematurely old İztirab və xəstəlik onu vaxtından əvvəl qocaltmışdı*; **2.** *pl* qayğı; *He has a lot of financial worries at the moment Onun bu anda çoxlu maliyyə qayğıları vardır*; **little domestic worries** kiçik ailə qayğıları; **money worries** pul qayğıları; *What's your worry? Səni/Sizi nə narahat edir? Sənin/Sizin qayğıların/ qayğılarınız nədir?*

**worry**[2] [ˈwʌrɪ] *v (pt, pp* **-ied**) **1.** təngə gətirmək, bezikdirmək, usandırmaq; dalınca düşmək, əl çəkməmək, qəmiş olmaq; **to ~ *smb.* with foolish questions** bir kəsi axmaq suallarla təngə gətirmək/ usandırmaq/bezikdirmək; *She was always worrying her father to buy a car O həmişə atasından əl çəkmirdi ki, o, avtomobil alsın; Don't worry him! Onu təngə gətirmə! Əl çək ondan!* **to ~ the enemy** *hərb.* düşməndən əl çəkməmək, düşməni bezikdirmək, düşmənə dinclik verməmək; **2.** narahat etmək, iztirab/ tələş törətmək, təşviş doğurmaq, iztirab/əziyyət vermək, incitmək *(özünü, başqasını)*; *His wound worries him Yarası ona əziyyət verir/onu narahat edir; What worries me is how I'm going to tell it to the children Məni tələşə salan / incidən odur ki, mən onu necə uşaqlara deyim; It worries me that they haven't answered my letters Məni narahat edən odur ki, onlar mənim məktublarıma cavab verməyiblər*; **3.** gəmirmək, didmək, parçalamaq *(adət. itlər haq.)*; **a dog ~ing a bone** sümük gəmirən it; **a cat ~ing a mouse** siçan parçalayan pişik; **to ~ along** çətinliklərə sinə gərmək, maneələri yarıb keçmək; sağ qalmaq, bütün vəziyyətlərdən çıxmaq; *We'll worry along somehow d.d. Biz vəziyyətdən bir təhər çıxacağıq*; **to ~ out** aradan qaldırmaq, həll etmək *(çətinlikləri)*; **to ~ out a problem** problemi həll etmək; *Worry him out till he gives his consent! Razılığını verməyincə onu rahat buraxma/ buraxmayın;*

◊ **to ~ to death** əldən salmaq, çox yormaq; qəbrə aparmaq *(əl çəkməmə, xahiş və s. nəticəsində)*; *She is worrying herself to death O özünü əldən salır*

**worse**[1] [wə:s] *n* pislik, pis; **to go from bad to ~** getdikcə pisləşmək; **to have the ~** məğlubiyyətə uğramaq; **a change/a turn for the ~** pisliyə doğru dəyişiklik; *Worse cannot happen Bundan da betər/ pis şey baş verə bilməz*

**worse**[2] [wə:s] *adj* **bad** *sifətinin müqayisə dərəcəsi:* daha pis/betər; *He is worse today Onun bu gün halı daha pisdir; Ahmad is bad but his brother is worse Əhməd pis adamdır, lakin qardaşı ondan da pisdir;* **to make matters ~** *d.d.* işləri daha da korlamaq/ pisləşdirmək; *What is worse? d.d. Bundan daha da pis?; He fell into the river but is none the worse for it O, çaya yıxıldı, ancaq ona heç bir şey olmadı/heç bir xətər toxunmadı;* **to be the ~ for wear 1)** köhnə/ geyilmiş olmaq; **2)** zəifləmək, taqətdən/ əldən düşmək, üzülmək; *The defeated challenger looked somewhat the worse for wear after the big fight Məğlub olmuş iddiaçı ağır döyüşdən sonra bir qədər taqətdən düşmüş kimi göründü;*

◊ **~ luck** təəssüf ki,…; *I've got to go, worse luck! Təəssüf ki, mən getməliyəm;* **to be the ~ for wear** nimdaş /köhnə olmaq; *My shoes are the worse for wear Mənim ayaqqabılarım nimdaşdır/geyilməyə yaramır;* **to be none the ~ for** *smth.* heç bir şey olmamış kimi, heç bir şeydən əziyyət çəkməmiş kimi

**worse**[3] [wə:s] *adv* **badly** *zərfinin müqayisə dərəcəsi:* **1.** daha pis; *You are playing worse than you did last week Sən/Siz keçən həftədəkindən indi daha pis oynayırsan/oynayırsınız; They said they had fixed the car, but it's now running even worse than before Dedilər ki, onlar maşını düzəldiblər, lakin o indi əvvəlkindən də daha pis işləyir; He behaves worse than ever O özünü əvvəlkindən pis aparır;* **2.** daha güclü; *It is raining worse than ever Yağış daha da bərk yağır; I hate him worse than before Mən ona əvvəlkindən daha çox nifrət edirəm;*

◊ *None the worse Heç də az yox, daha çox; I like him none the worse for being outspoken Mən onu səmimi olduğuna görə daha da çox istəyirəm*

**worsen** [wə:sn] *v* pisləşmək; pisləşdirmək; *The rain has worsened our difficulties Yağış bizim çətinliklərimizi daha da artırdı;* **to ~ economic crisis** iqtisadi böhranı pisləşdirmək; *The patient's condition worsened during the night Gecə (vaxtı) xəstənin vəziyyəti pisləşdi*

**worship**[1] [ˈwə:ʃıp] *n* **1.** pərəstiş, sitayiş; **an object of ~** pərəstiş obyekti/hədəfi; **the ~ of rank/of wealth/of success** rütbə/sərvət/uğur qarşısında pərəstiş; **to offer ~ to** ***smb./to smth.*** bir kəsə/bir şeyə sitayiş etmək; **2.** kult, dini ayin/ibadət; **freedom of ~** dini ayinlərin icra edilməsi azadlığı; **~ of images** bütlərə sitayiş/ibadət etmə; **place of ~** ibadət yeri; məbəd, ibadətxana; kilsə; **3.** *arx.* nüfuz, hörmət, ehtiram; şərəf; **a man of great ~** böyük hörmətə/nüfuza layiq adam, böyük hörmət/ şərəf sahibi olan adam; **to win/to have ~** nüfuz/ hörmət qazanmaq;

◊ **Your Worship** cənabınız *(hakimə, bələdiyyə rəisi və s. müraciətdə); Good morning, Your Worships! Sabahınız xeyir, cənab!* **freedom of ~** vicdan azadlığı

**worship**[2] [ˈwə:ʃıp] *v* **1.** sitayiş/pərəstiş etmək; **to ~ God/idols** Allaha/bütlərə sitayiş etmək; **to ~ money** pula pərəstiş etmək; **2.** səcdə etmək, ilahiləşdirmək, son dərəcə sevmək, məftun olmaq, ehtiram etmək; *He worships his mother O, anasına səcdə edir;* **3.** *din.* ibadət etmək; dua etmək *(xüs. kilsədə); Where does he worship? O harada ibadət edir?*

**worshipper** [ˈwə:ʃıpəʳ] *n* **1.** sitayiş/pərəstiş edən adam, pərəstişkar; **2.** *din.* ibadət/dua/səcdə edən adam; *The church was full of worshippers Kilsə ibadətə gələnlərlə dolu idi*

**worshipful** [ˈwə:ʃıpful] *adj arx.* möhtərəm, lütfkar, hörmətli *(müraciətdə);* **Worshipful sir!** Möhtərəm/ Hörmətli cənab!

**worst**[1] [wə:st] *n* **1. the worst** *(sing)* ən pis şey/hissə/ vəziyyət/hal/şəxs; *The worst of the storm is over Fırtına yatmağa başlayır;* **the ~ of it is that…** *d.d.* ən pisi odur ki,…; *If the worst comes to the worst Ən pis halda; Bəd ayaqda, Bədəbəddə; If the worst comes to the worst, we'll have to sell the house Bədəbəddə, biz evi satmalı olacağıq;* **his ~ mistake** onun ən pis (ən ciddi) səhvi; *It was the worst winter for 50 years 50 ildə bu ən pis qış idi;* **the ~ airline disaster** ən pis təyyarə qəzası; **when things are at their (the) ~…** ≅ vəziyyət ümidsiz/pis olanda…; *She was always optimistic, even when things were at their worst İşlər hətta ümidsiz/ən pis vəziyyətdə olanda da, o həmişə optimist /nikbin olurdu; I was prepared for the worst when I saw the wrecked car Qəzaya uğramış maşını görəndə mən bundan da betər şeyə hazır idim;* **2.** ən qəddar/qatı/ zalım; **his ~ enemy** onun ən qəddar düşməni; **a criminal of the ~ kind** ən qəddar/ən zalım (növ) cani; **(in) the ~ way** *amer. d.d.* çox bərk, hədsiz/son dərəcədə;

◊ **at (the) ~** lap pis halda; *At the very worst, he'll have to pay a fine Bədəbəddə /Lap pis halda o, cərimə verməli olacaq;* **to do** ***one's*** **~** əlindən gələn pisliyi etmək; *Let them do their worst – we'll fight them every inch of the way Qoy onlar əllərindən gələn pisliyi etsinlər – biz yolun hər bir qarışı üçün onlarla vuruşacağıq;* **to get the ~ of it** bərk məğlubiyyətə düçar olmaq; *The dog had been in a fight and had obviously got the worst of it İt boğuşmuş və açıq-aşkar bərk məğlub olmuşdu;* **the ~ of all (possible) worlds** əlverişsiz/əlverişli olmayan vəziyyət; *The country has ended up with the worst of all worlds: inflation, unemployment and food shortages Ölkə çox əlverişsiz bir vəziyyətlə üzləşdi: inflyasiya, işsizlik və qida çatışmazlığı;* **to put to the ~** məğlub etmək; əzmək *(düşməni):* **to give one the ~ of it 1)** məğlub etmək; **2)** aldatmaq **to fall for** ***smb.*** **in the ~ way** bir kəsə hədsiz dərəcədə vurulmaq/aşiq olmaq

**worst**[2] [wə:st] *adj* **bad** *sifətinin üstünlük dərəcəsi:* **1.** ən/ lap/hədsiz pis; *Tom played (the) worst Tom hamıdan pis oynadı; We were the worst treated Bizlərlə çox pis rəftar etdilər; It's the old and the poor who suffer worst when subsidies are cut Maddi yardım kəsiləndə ən çox qocalar və kasıblar əziyyət çəkirlər;* **the ~ dressed man in the office** idarədə/ofisdə ən pis geyinmiş adam; **2.** ən çox, çox bərk; *That frightened me worst of all O məni hər şeydən çox qorxutdu*

**worst**[3] [wə:st] *v* qalib gəlmək, məğlub etmək, əzmək; *He worsted his enemy O, düşmənini məğlub etdi/əzdi; We were worsted in battle Biz vuruşda məğlub olduq*

**worst**[4] [wə:st] *adv* **badly** *zərfinin üstünlük dərəcəsi:* ən/lap pis; *She behaves worst O özünü lap pis aparır*

**worsted** [ˈwustıd] *n toxuc.* zərif yundan parça, kamvol parça; **a ~ suit** zərif yundan kostyum

**wort** [wə:t] *n arx.* bitki *(yeyilən və ya müalicəvi)*

**worth**[1] [wə:θ] *n* **1.** dəyər, qiymət, dəyərlilik; *It's not worth more than two pounds Bunun iki funtdan artıq dəyəri yoxdur; I know the true worth of his friendship Mən onun dostluğunun həqiqi qiymətini bilirəm; The storm did thousands of pounds' worth of damage Fırtına minlərlə funt sterlinq dəyərində zərər vurdu;* **discoveries of great ~** böyük əhəmiyyətə malik kəşflər; *Give me a shilling's worth of stamps Mənə bir şillinq dəyərində marka ver/verin;* **a pearl of great ~** çox qiymətli mirvari; **2.** ləyaqət, qədir-qiymət; yaxşı cəhət; **a man of ~** ləyaqətli/hörmətə layiq adam; **to know a friend's ~** dostun qədir-qiymətini bilmək; **to be aware of** ***one's*** **~** öz qədir-qiymətini bilmək; **3.** *arx.* var, mal, var-dövlət, əmlak, mülk; **to count** ***one's*** **~** öz var-dövlətini hesablamaq;

◊ **to take at/of/to/in ~** *arx.* düzgün qiymətləndirmək, **to put in** ***one's*** **two cents ~** öz fikrini demək, öz mülahizəsini bildirmək/söyləmək

**worth**[2] [wə:θ] *adj* **1.** dəyəri/qiyməti /əhəmiyyəti olan; *What is it worth? Bunun dəyəri nə qədərdir? Bu neçəyədir? It's about 2 pounds worth Bu iki funt sterlinqdir; The property is worth $ 5000 Bu mülk/əmlak 5000 dollardır, Bu mülkün dəyəri 5000 dollardır; I paid only $ 3000 for his painting, but it's worth a lot more Mən onun şəklinə 3000 dollar verdim, lakin onun dəyəri daha çoxdur;* **poems of little ~** *şair.* zəif/dəyərsiz şerlər, az əhəmiyyət kəsb edən şerlər; **2.** layiq/diqqətəlayiq/dəyəri olan; yarayan; **~ attention** diqqətəlayiq olan; **to be ~ little** az əhəmiyyəti/dəyəri olmaq; **to be ~ nothing** heç bir şeyə yaramamaq; *Is life worth living? Həyat yaşamağına dəyərmi? It is not worth the trouble Bu, əzab-əziyyətə dəyməz; This book is well worth reading Bu kitab oxumağına dəyər; This play is worth seeing Bu pyesə baxmağına dəyər;* **3.** müəyyən mala-mülkə/var-dövlətə sahib olan; *He is worth over a million Onun malı-mülkü bir milyondan artıqdır; He is worth about £ 10 million Onun malı-mülkü təxminən 10 milyon funt sterlinqdir; He is worth money O, dövlətlidir; That's all I am worth Bax budur, mənim bütün var-dövlətim;*

◊ **for all one (it) is ~** var qüvvəsi ilə, bütün gücü ilə; *It is a marvelous part, and she plays it for all it's worth Bu, ən gözəl roldur və o bunu var gücü ilə oynayır; A bird in the hand is worth two in the bush Soğan olsun, nəqd olsun;* **to run for all one is ~** var gücü ilə qaçmaq; *You must take it for what it is worth Sən/Siz kor-koranə qəbul etməməlisən/ etməməlisiniz; The game is not worth the candle ≅ at.söz. Qoyulan xərcə dəyməz; Not worth a button ≅ Bir qəpiyə dəyməz; Not worth the trouble ≅ Zəhmətinə dəyməz;* **to be ~** ***one's*** **salt/*one's* keep/*one's* meat and drink** yaxşı işləmək *(muzdlu işçi haq.); Not worth a damn, a straw, a red cent, a tinker's cuss ≅ Bir qəpiyə dəyməz; Their promises are not worth a damn Onların vədləri bir qəpiyə dəyməz;* **~** ***smb.'s*** **while** bir kəsə gəlirli, mənfəətli və ya maraqlı olma; *It would be (well) worth your while to come to the meeting Sənə/Sizə iclasa gəlmək çox xeyirli ola bilər*

**worthily** [ˈwə:ðılı] *adv* **1.** ləyaqətlə, layiqincə, hörmətlə; **2.** hörmətinə/ləyaqətinə görə, haqlı olaraq

**worthless** [ˈwə:θlıs] *adj* dəyərsiz, qiymətsiz, heç bir şeyə dəyməyən; mənasız, əhəmiyyətsiz; lüzumsuz, gərəksiz, faydasız, bekara; **~ old chairs** lazımsız/ bekara/köhnə stullar; **~ promises** faydasız/mənasız vədlər; **a ~ character** bekara xasiyyət; **~ arguments** mənasız/gərəksiz dəlillər

**worth-while** [ˈwə:θˈwaıl] *adj* dəyərli, əhəmiyyətli, diqqətəlayiq, müəyyən qiyməti olan; **~ experiment** dəyərli/diqqətəlayiq təcrübə; **to be ~** əhəmiyyət/ məna kəsb etmək; *Nursing is a very worth-while career Xəstələrə qulluq çox dəyərli/ diqqətəlayiq bir işdir*

**worthy**[1] [ˈwə:ðı] *n* **1.** ləyaqətli/ hörmətli/məşhur/ tanınmış adam; **local worthies** yerli zadəganlar /əyanlar; *All local worthies have been invited to the ceremony Mərasimə bütün yerli zadəganlar*

*dəvət olunmuşdular*; **2.** *arx.* qəhrəman; **3.** *zaraf.* şəxsiyyət, zat, tip

**worthy[2]** [ˈwəːðɪ] *adj* **(-ier, -iest) 1.** layiq olan; ləyaqətli, diqqətəlayiq, dəyərli **(of)**; ~ **of the name** adına layiq, haqqında danışmağa dəyən; ~ **of praise,** ~ **to be praised** hər cür tərifə layiq; **a statement** ~ **of contempt** nifrətə layiq bəyanat; *Her achievements are worthy of the highest praise Onun nailiyyətləri ən yüksək tərifə layiqdir*; **2.** müvafiq (olan), münasib, uyğun, layiq olan; **to receive a** ~ **reward** xidmətinə layiq mükafat/bəxşiş almaq; **3.** *kin.* çox hörmətli/möhtərəm; **a** ~ **man** çox hörmətli/möhtərəm adam; *Give our worthy friend some money Bizim bu möhtərəm dostumuza bir az pul ver/verin*

**-worthy** [ˌwəːðɪ] *mürəkkəb sifətlərin tərkib hissəsi kimi işlənir və Azərbaycan türkcəsində mürəkkəb sifətlərin tərkibində işlənən* **layiq** *komponentinə uyğun gəlir:* note**worthy** diqqətə**layiq**; blame**worthy** töhmətə**layiq**, məzəmmətə**layiq**, danlağa**layiq**; trust**worthy** etibara**layiq**

**wot** [wɔt] *v arx.* bilmək; *God wot! Allah bilir*

**would** [wud] *(tam forma)*; [wəd, əd, d] *(zəif formalar)* **1. will** *felinin pt forması*; **2.** *Köməkçi fel olaraq aşağıdakı hallarda işlədilir:* **1)** *2-ci və 3-cü şəxslərdə gələcəyə nəzərən keçmiş zaman formasını düzəltmək üçün: He told us he would come at 5 O bizə dedi ki, saat 5-də gələcək*; **2)** *şərt şəklini düzəltmək üçün: He would come if you invited him Sən/Siz onu dəvət etsəydin/ etsəydiniz, o gələrdi; If he were in your place he would do it O sənin/sizin yerində/yerinizdə olsaydı, o bunu edərdi*; **3.** *Modal fel olaraq aşağıdakı mənaları bildirir:* **1)** inadkarlıq, inad, israr, sözünün üstündə durma, səbat; *I warned you, but you would do it Mən səni/sizi xəbərdar etmişdim, lakin sən/siz onu etməkdə israr etdin/etdiniz*; **2)** arzu, istək, iradə, təmayül; *I would not do it for anything Mən onu heç vəchlə etmərəm/etməzdim; Come when you would İstədiyin/ İstədiyiniz vaxt gəl/gəlin; I would rather stay at home Mən böyük məmnuniyyətlə evdə qalardım*; **3)** ehtimal, mümkünlük, yəqinlik; *That would be his house Ehtimal ki, bu onun evidir*; **4)** nəzakətli xahiş; *Would you help me, please? Sən/Siz mənə kömək edərsənmi?/edərsinizmi? Would you open the door for me, please? Zəhmət olmasa, mənim üçün qapını aça bilərsənmi?/ bilərsinizmi?*; **4. like, love, hate, prefer, to be glad /happy** *və s. sözlərlə işləndikdə* **üstün tutma** *mənasını bildirir: I'd love a cup of coffee Mən bir fincan kofe içməyi üstün tuturam; I'd be only too glad to help Mən kömək etməyə çox şad olardım; Where would you like to sit? Sən/Siz harada oturmağı istərdin?/istərdiniz?* **5. imagine, say, think** *və s. sözlərlə işləndikdə qəti əminlik, fikir, nöqteyi-nəzər ifadə edir; I would imagine the journey will take about an hour Mən belə təsəvvür edirəm ki, səyahət təxminən bir saat çəkər; I'd say he was about fifty Mən deyərdim ki, onun əlliyə yaxın yaşı olar*; **6.** *Keçmişdə təkrar hərəkətləri və vərdişləri təsvir etdikdə: When my parents were away, my grand-mother would look after me Valideynlərim evdə olmayanda, nənəm mənə baxardı; She would get up early in her childhood O, uşaqlığında erkən/tezdən durardı*; **7. wish** *felindən sonra arzu olunan, istənilən şeyin baş verməsinin nəzərdə tutulduğunu bildirir: I wish you'd be quiet for a minute Mən sənin /sizin bir az/dəqiqə sakit olmağını/olmağınızı istərdim; He wishes (that) the girl would leave him O istəyir ki, qız onu tərk etsin*

**would-be[1]** [ˈwudbiː] *adj* **1.** *d.d.* bir şeyin iddiasında olan, bir şeyi istəyən/arzu edən; ~ **candidate** seçki iddiasında olan namizəd; ~ **poet /artist /author** şair/ rəssam/müəllif olmaq iddiasında olan adamlar; **2.** fərz / ehtimal / güman / təxmin edilən; potensial; **3.** uydurma, saxta, yalançı, süni, riyakar

**would-be[2]** [ˈwudbiː] *adv* hiylə ilə, yalandan, riyakarlıqla

**wouldn't** [wudnt] *d.d.* **would not** *birləşməsinin qısa forması*

**wound[1]** [wuːnd] *n* **1.** yara; yaralanma; **a knife /stab** ~ bıçaq/xəncər yarası; **green** ~ təzə/bitişməmiş yara; *He died after receiving two bullet wounds in the head O, başından iki güllə yarası alandan sonra öldü*; ~ **of exit/of entry** *tib.* yaranın çıxış/giriş deşiyi; **2.** *məc.* zərər, ziyan; təhqir; küsü, inciklik, incimə; **to reopen a** ~ köhnə dərdi/yaranı təzələmək; **to inflict a** ~ **upon** *smb.'s* **honour** bir kəsin şərəfini təhqir etmək; *It was a wound to my pride Bu mənim qüruruma toxundu*; **3.** kəsik, çapıq *(ağac üzərində və s.)*;

◊ **to put salt into the** ~ **/***smb.'s* ~ bir kəsin yarasına duz tökmək/köz basmaq

**wound[2]** [wuːnd] *adj* yara; ~ **treatment** *tib.* yara müalicəsi; ~ **suture** *tib.* yara tikişi; ~ **dressing** *tib.* yara sarğısı; ~ **healing** yaranın sağalması

**wound[3]** [wuːnd] *v* **1.** yaralamaq; *He was wounded in the head O, başından yaralanmışdı; The guard was wounded in the leg Gözətçi ayağından yaralanmışdı*; **2.** *məc.* toxunmaq, əziyyət vermək, incitmək, sataşmaq, təhqir etmək; **to** ~ *smb.'s* **feelings** bir kəsin hisslərinə toxunmaq; *He was wounded in his deepest affections Onun ən yaxşı hissləri təhqir olunmuşdu*

**wound[4]** [waund] **to wind** *felinin pt, pp formaları*

**wound-up** [ˈwaundʌp] *adj* qurulmuş *(saat və s. haq.)*



**wounded** [ˈwuːndɪd] *adj* **1.** yaralı, yaralanmış; **2.** *məc.* incidilmiş, toxunulmuş, təhqir edilmiş; ~ **pride** toxunulmuş/təhqir edilmiş qürur

**wove** [wouv] **to weave** *felinin pt forması*

**woven** [ˈwouvn] **to weave** *felinin pp forması*

**wow[1]** [wau] *n sl.* **1.** qiyamət, qeyri-adi, adətdən xaric, qəribə; *It is a wow! Bax bu, qiyamətdir!* **2.** *teatr.* böyük müvəffəqiyyət *(pyes və s. haq.)*; **to go with a** ~ böyük müvəffəqiyyət/uğur qazanmaq

**wow[2]** [wau] *v* təəccübə salmaq, təəccübləndirmək, heyrətləndirmək, heyrətə salmaq, heyran etmək, mat qoymaq; *He wowed Broadway with a brilliant performance O, Brodvey teatr aləmini öz gözəl tamaşası ilə heyrətə saldı*

**wow[3], wowee** [wau], [wauˈiː] *int. amer.* çox yaxşı, əcəb, çox gözəl, əla; *Wow! You look terrific Əcəb gözəl görünürsən/ görünürsünüz!*

**wrack[1]** [ræk] *n* I **1.** dənizin sahilinə atılmış yosun; **2.** sahilə atılmış şey *(çaydan, göldən və s.)*

**wrack** [ræk] *n* II **1.** *arx. şair.* dağılma, uçma, viran olma; **to go/to run to** ~ məhv olmaq, uçulmaq, viran olmaq, dağılmaq; ~ **and ruin** tam dağılma, tamamilə məhv olma; **to bring/to put to** ~ dağıtmaq; məhv etmək; **2.** *arx. şair.* intiqam, qisas; düşmənçilik, təqib; **3.** dağıntı, xarabalıq, viranəlik, xarabaxana

**wrack[2]** [ræk] *v* **1.** dağıtmaq, uçurtmaq; viran /məhv etmək; **2.** dağılmaq, uçmaq; qəzaya uğramaq; **to be ~ed** dağılmaq, məhv olmaq; qəzaya uğramaq

**wraith** [reɪθ] *n* ruh; kabus; xəyal; qarabasma

**wrangle[1]** [ˈræŋgl] *n* mübahisə, dava-dalaş, höcətləşmə; *They were involved in a long legal wrangle with the company over payment Onlar pul ödənişi üstündə kompaniya ilə uzun məhkəmə davasına girişmişdilər*

**wrangle[2]** [ˈræŋgl] *v* **(with** *smb.***/ about/over** *smth.***)** mübahisə etmək, höcət etmək, sözləşmək, deyişmək; dalaşmaq *(bir kəslə bir şey üstündə)*; *What are they wrangling about? Onlar nə üstündə mübahisə edirlər?/höcətləşirlər?* **to** ~ **out 1)** mübahisəni sona qədər aparmaq; **2)** mübahisədə nəyəsə nail olmaq; **to** ~ *smb.* **out of his faith** mübahisə nəticəsində bir kəsi öz inamından əl çəkməyə inandırmaq

**wrangler** [ˈræŋglə'] *n* **1.** boşboğaz/mübahisəçi/höcət adam; **2.** riyaziyyat üzrə imtahanda xüsusi fərqlənən tələbə *(Kembric universitetində)*; **3.** *amer. d.d.* kovboy *(Şimali Amerikada atlı çoban)*

**wrap[1]** [ræp] *n* **1.** şal, örpək; çiyin örtüyü *(mexdən)*; böyük yun şal; **2.** *pl* adyal; **3.** dolama, sarıma, bükmə; sarğı; **4.** *pl* üst paltarı

**wrap[2]** [ræp] *v* **(-pp-) (wrapped [-t], wrapt) 1.** bürümək, sarımaq, dolamaq; **to** ~ **oneself** özünü bürümək; **to** ~ **a scarf round** *one's* **neck** boynuna şərf dolamaq; **to** ~ **a bandage round** *one's* **ankle** topuğuna sarğı dolamaq; **2. (round, about)** bükmək, bürümək; **to** ~ **in paper** kağıza bükmək; *The Christmas presents were wrapped (up) in shiny green paper Yeni il hədiyyələri parlaq yaşıl kağıza bükülmüşdü*; **to** ~ **a child in a shawl** uşağı şala bükmək; **3.** qərq olmaq, bürümək, dalmaq; **to** ~ **in mist/in smoke /in darkness** dumana/tüstüyə/ qaranlığa qərq olmaq; **to** ~ **in flames** alov bürümək; **to** ~ **in slumber** yuxuya dalmaq; **to** ~ **in woe** dərdə/qəmə qərq olmaq; **to** ~ **about** bürünmək *(bir şeyə)*; sarımaq *(bir şeyi)*; *She wrapped her shawl closer about her O, şalına möhkəm büründü*; **to** ~ **around** sarılmaq, sarmaşmaq; *The child wrapped her arms around her mother Uşaq anasına sarıldı/ sarmaşdı*; **to** ~ **over** üstünü örtmək/ basdırmaq; **to** ~ **round** ətrafına bürümək; **to** ~ *one's* **cloak round one** plaşına bürünmək; **to** ~ **up 1)** bürünmək, sarınmaq; *Wrap up well – it's cold outside Yaxşıca bürün/ bürünün – bayırda soyuqdur*; **2)** bükmək, sarımaq; **to** ~ **up a book** kitabı bükmək; **to** ~ **up a parcel 1)** bağlamanı bükmək; **2)** *məc.* gizlətmək; **to** ~ **up his meaning in allegory** öz fikrini alleqoriya ilə gizlətmək; **3)** bitirmək, tamamlamaq; qısa xülasə vermək; **to** ~ **up a case** işi tamamlamaq/bitirmək; *I had already wrapped up a couple of deals by dinner-time Mən nahar fasiləsinədək artıq bir neçə işi tamamlamışdım*; **4)** sıx əlaqələndirmək; *Success is wrapped up in the efforts of millions Müvəffəqiyyət milyonlarla adamların təşəbbüsü/ səyi ilə sıx əlaqədardır*;

◊ **to be ~ped up in** *smth.* **1)** bir şeyə dalmaq/ qapılmaq/başı qarışmaq *(xəyala, fikrə, işə və s.)*; *She is wrapped up in her children Onun başı uşaqlarına qarışıb; He is wrapped up in thought O, fikrə dalıb/qapılıb*; **2)** bir şeylə əlaqədə olmaq; *This country's prosperity is wrapped up in its shipping Bu ölkənin tərəqqisi onun gəmiçiliyi ilə əlaqədardır*; **3)** *məc.* bir şeyə çulğalanmış/ bürünmüş olmaq; *The affair is wrapped up in mystery Bu, müəmmalı/sirli işdir, Bu iş sirlə çulğalanmışdır*

**wrapper** [ˈræpə'] *n* **1.** *amer.* xalat; kapot *(xalataoxşar kişi və ya qadın paltarı)*; **2.** sarğı; banderol *(həm də* **postal** ~*)*; **chocolate sweet** ~**s** şokolad konfet sarğıları; **3.** üzlük, cild üzlüyü *(kitabda, broşürada)*

**wrapping** [ˈræpɪŋ] *n (adət. pl)* sarğı, bükmə; sarğı kağızı

**wrapt** [ræpt] **to wrap** *felinin pt, pp forması*

**wrap-up** [ˈræpˌʌp] *n amer. radio.* yeniliklər/son xəbərlər haqda qısa məlumat

**wrath** [rɔθ] *n* qəzəb, acıq, qeyz, hiddət; **the** ~ **of God** Allahın qəzəbi; **to vent** *one's* ~ **on** *smb.*

acığını/ qəzəbini bir kəsin üstünə tökmək; **to bottle up** *one's* ~ qəzəbini güclə boğmaq/gizlətmək; **the day of** ~ *din.* qiyamət günü

**wrathful** ['rɔθful] *adj* qəzəbli, acıqlı, qeyzli, hiddətli

**wreak**[1] [ri:k] *n arx.* intiqam

**wreak**[2] [ri:k] *v* əl-qol açmaq, çəkinməmək, öz bildiyini etmək; tökmək *(acıq və s.)*; **to** ~ *one's* **fury upon** *smb.* öz acığını/qəzəbini bir kəsin üstünə tökmək

**wreath** [ri:θ] *n* 1. əklil; çələng *(çiçəklərdən hörülmüş bəzək)*; **a funeral** ~ matəm əklili; *We laid wreath at the war memorial Biz müharibədə həlak olanların abidəsinə əklil qoyduq*; **a laurel** ~ dəfnə əklili; 2. burum-burum; topa-topa, halqa-halqa *(tüstü, duman və s. haq.)*; ~**s of mist** duman topaları

**wreathe** [ri:ð] *v* 1. hörmək, lülə şəklində bükmək, bürmələmək; 2. sarılmaq, dolanmaq; bürünmək, qərq olmaq; *The hills were wreathed in mist Təpələr dumana bürünmüşdü/qərq olmuşdu*; 3. örtülmək, örtmək *(qırışıqla və s.)*; 4. burulub/topa-topa qalxmaq, burum-burum qalxmaq *(tüstü, duman haq.)*; *Smoke wreathed upwards Tüstü topa-topa yuxarı qalxdı*

**wreathed**[1] [ri:ðd] **to wreath** *felinin pt, pp forması*

**wreathed**[2] [ri:ðd] *adj* 1. hörülmüş *(əklil, çələng haq.)*; 2. örtülmüş, bürünmüş; qərq olmuş; **a face** ~ **in wrinkles** qırışlarla örtülmüş sifət/üz; **stems** ~ **with clusters of purple flowers** al qırmızı çiçək salxımları ilə bürünmüş ağac gövdələri; **a face** ~ **in smiles** təbəssümə qərq olmuş sifət/çöhrə; 3. burula-burula/topa-topa qalxmış *(tüstü, duman haq.)*

**wreck**[1] [rek] *n* 1. qəza, məhv olma *(gəmi)*; avariya *(təyyarə və s.)*; bədbəxt hadisə, fəlakət, qəza *(dəmir yolunda)*; **to suffer** ~ qəzaya uğramaq; **to go to** ~ məhv olmaq, dağılmaq; *The house was a wreck after the party Ziyafətdən sonra ev bir-birinə qarışmışdı*; 2. gəminin sahilə atılmış qalıqları *(qəza nəticəsində)*, parça, qırıntı *(təyyarə, maşın və s.)*; 3. *məc.* 1) haldan düşmüş/səhhəti pozulmuş adam *(xəstəlikdən, qocalıqdan)*; *What a wreck of his former self he is O necə də xarab olub, O necə də haldan düşüb; She is a wreck of her former self Ondan heç bir şey qalmayıb, O, çöpə dönüb*; 2) puç olma, boşa çıxma *(ümid və s.)*; **human** ~**s** məhv/puç olmuş adamlar

**wreck**[2] [rek] *adj*: ~ **derrick** qaldırıcı qəza kranı; ~ **mark** *dən.* batmış gəminin yerini göstərən işarə

**wreck**[3] [rek] *v* 1. batırmaq *(gəmini)*; qəza törətmək, qəzaya uğratmaq *(gəmini, təyyarəni)*; sıradan çıxarmaq *(tankı və s.)*; *The ship was wrecked off the coast of France Gəmi Fransanın sahilində qəzaya uğradı*; **to be** ~**ed** 1) qəzaya uğramaq; 2) *məc.* pozmaq, xarab etmək *(səhhət və s.)*; **to** ~ *smb.'s* **nerves** bir kəsin əsəblərini pozmaq/korlamaq; 2. *məc.* boşa çıxmaq, puç etmək, alt-üst olmaq *(plan, ümid və s.)*; *The weather wrecked all our plans Hava bizim bütün planlarımızı pozdu/puç etdi*; 3. qəzaya düçar olmaq, fəlakətə düşmək; 4. sökmək, uçurmaq, dağıtmaq *(binanı)*

**wreckage** ['rekɪdʒ] *n* 1. qəza/avariya qırıntıları/qalıqları/parçaları; *Wreckage of the aircraft was scattered over a wide area Təyyarənin qalıqları geniş əraziyə səpələnmişdi; A few survivors were pulled from the wreckage Qəzanın qalıqları altından bir neçə sağ qalanlar çıxarıldı*; 2. *məc.* sonu çatmış adamlar; keçmişin qalıqları; 3. qəza, məhv olma, avariya *(gəmi, təyyarə haq.)*

**wrecked** [rekt] *adj* gəmi qəzasına /fəlakətə /avariyaya uğramış; *The ship /The train was wrecked Gəmi/Qatar qəzaya uğradı*

**wrecker** ['rekəʳ] *n* 1. çapovulçu, soyğunçu, talançı, qarətkar; qəzaya uğrayan gəmiləri soyan adam; 2. *amer. d.y.* təmir briqadasının fəhləsi; 3. texniki yardım maşını; 4. *amer.* evi uçuran/sökən fəhlə; 5. *pl* ev sökmə/uçurma firması

**wrecking**[1] ['rekɪŋ] *n* 1. dağılma, uçulma, viran olma; dağıdılma, uçurdulma, xarab/viran edilmə; 2. dağıtma, uçurtma, sökmə, yıxma *(evi)*; 3. *amer.* qəza-xilasetmə işləri; 4. *məc.* pozma, boşa çıxarma *(planı və s.)*

**wrecking**[2] ['rekɪŋ] *adj* 1. xilasedici; ~ **car** xilasedici maşın; ~ **crew** *hərb.* xilasedici komanda; 2. evləri uçurtma briqadası; 3. dağıdıcı, viranedici, məhvedici; ~ **policy** dağıdıcı/məhvedici siyasət

**wren** [ren] *n* 1. *bot.* gicitkənlik; 2. *zool.* çalıquşu; vürok *(sərçə sinfindən olan quş)*

**wrench**[1] [rentʃ] *n* 1. dartma; sıxma, burma; *He pulled the handle off with a single wrench O, bir dəfə dartmaqla dəstəyi çıxartdı*; **to give** *smth.* **a** ~ bir şeyi dartmaq/burmaq; 2. çıxıq, çıxıq yeri; burxuq; burxulma; **to give** *one's* **ankle a** ~ topuğunu burxutmaq; 3. *məc.* sıxıntı, həsrət, xiffət; kədər, qüssə; ağrı *(ayrılarkən)*; *Separation from her children was a terrible wrench Uşaqlarından ayrılmaq onun üçün dəhşətli dərəcədə ağrılı /çox çətin idi*; **the** ~ **of saying good-bye** ayrılıq həsrəti/ xiffəti/ağrısı; 4. təhrif *(həqiqəti, mətni v s.)*; 5. *tex.* qayka açarı

**wrench**[2] [rentʃ] *v* 1. dartıb almaq/çıxartmaq/ qopartmaq, çəkib çıxartmaq; *He wrenched the gun from/out of her hands O, tüfəngi dartıb onun əlindən aldı/çıxartdı*; **to** ~ **a knife from** *smb.* bir kəsdən bıçağı dartıb almaq; **to** ~ **a door off its hinges** qapını dartıb həncəmasından çıxartmaq; **to** ~ **a plant out of the ground** bitkini torpaqdan dartıb çıxartmaq; 2. *tib.* burxutmaq; çıxartmaq; *I fell and wrenched my ankle Mən yıxıldım və topuğumu burxutdum/çıxartdım*; 3. qoparmaq, zorla almaq, məcbur etmək *(razılıq, etiraf və s.)*; **to** ~ **a confession of guilt from** *smb.* bir kəsi günahkar olduğunu etiraf etməyə/boynuna almağa məcbur etmək; 4. *məc.* sıxıntı vermək, xiffət etmək; kədər/qüssə oyatmaq; 5. təhrif etmək, səhv şərh vermək *(mətnə, qanuna və s.)*



**wrestle**[1] ['resl] *n id.* güləşmə, qurşaq tutma; güləşmə üzrə yarış; *məc.* inadlı mübarizə *(çətinliklə və s.)*; **a** ~ **for life** ölüm-dirim mübarizəsi

**wrestle**[2] ['resl] *v* 1. güləşmək, qurşaq tutmaq; *He wrestled his opponent to the ground O öz rəqibini yerə vurdu (güləşdə); Can you wrestle? Sən/Siz güləşə bilərsən?/bilərsiniz?* 2. *məc.* mübarizə aparmaq; əlləşmək; **to** ~ **with a difficult examination paper** çətin imtahan bileti ilə əlləşmək; **to** ~ **with a problem** problem üzərində baş sındırmaq/əlləşmək; **to** ~ **against/with temptation** nəfsə/tamaha qarşı mübarizə aparmaq; 3. *amer. dial.* torpağa/yerə yıxmaq *(dananı və s. damğalamaq üçün)*; **to** ~ **down** 1) dizi altına basmaq *(düşməni)*; 2) öhdəsindən gəlmək *(bir kəsin, bir şeyin)*; **to** ~ **out** 1) qurtarmaq, çıxmaq *(bir yerdən/şeydən)*; 2) bir şeyə nail olmaq; öhdəsindən gəlmək; **to** ~ **through** soxulub/yarıb keçmək; **to** ~ **together** bir-birilə mübarizə aparmaq;

◊ **to** ~ **with God** bərk dua etmək

**wrestler** ['resləʳ] *n id.* pəhləvan, güləşçi

**wrestling** ['reslɪŋ] *n id.* güləş, güləşmə, qurşaq tutma; **to watch (the)** ~ **on television** güləş üzrə yarışı televizorda müşahidə etmək

**wretch** [retʃ] *n* 1. bədbəxt/miskin/zavallı/fağır/ biçarə /yazıq adam; **poor homeless** ~**es** biçarə/bədbəxt/ zavallı adamlar; 2. yaramaz/rəzil/alçaq adam; *You wretch! You're late again Ay yaramaz! Yenə də gecikmisən*; 3. şuluqçu, dəcəl, yaramaz *(adət. uşaq haq.)*; *Don't do that, you little wretch! Elə etmə, ay balaca yaramaz!*

**wretched** ['retʃɪd] *adj* 1. bədbəxt, miskin, yazıq, fağır, biçarə; ~ **existence** miskin/şərəfsiz həyat; **to feel** ~ özünü bədbəxt/miskin hiss etmək; **to look** ~ yazıq/ miskin görünmək; 2. pis, heç nəyə yaramayan; çirkin, mənfur, iyrənc, murdar, rəzil; ~ **hovel** miskin görkəmli daxma/koma; ~ **state of things** şeylərin pis/ bərbad vəziyyəti; ~ **weather** pis/murdar hava; 3. *d.d.* bərk, dəhşətli, qüvvətli; ~ **toothache** bərk dişağrısı; ~ **stupidity** dəhşətli keylik; 4. *emf. var.* zəhrimara/ andıra qalmış; *I can't find that wretched umbrella/hat Mən bu zəhrimara/andıra qalmış çətiri/şlyapanı tapa bilmirəm*

**wrick**[1] [rɪk] *n* zədələnmə, gərilmə *(damar/əzələ haq.)*

**wrick**[2] [rɪk] *v* əzmək, zədələmək *(damarı, əzələni)*

**wriggle**[1] ['rɪgl] *n* 1. bükük, əyri, əyrilik, dirsək, girinti-çıxıntı; 2. əyilmə, bükülmə; qıvrılma *(bədən)*

**wriggle**[2] ['rɪgl] *v* 1. qıvrılmaq, burulmaq *(soxulcan, qurd haq.)*; əyilmək, bükülmək *(həm də* **to** ~ **oneself**); qovrulmaq; qurdalanmaq; *He wriggled uncomfortably on the hard chair O, bərk stulun üzərində narahatcasına qurdalanırdı; Stop wriggling (about) and sit still! Qurdalanma, sakitcə otur! The baby was wriggling its toes Bəbə ayaq barmaqlarını o yana, bu yana tərpədirdi*; **to** ~ **the tail** quyruq bulamaq; 2. sürünə-sürünə keçmək; soxulub gizlicə keçmək, yarıb /yol açıb keçmək *(həm də* **to** ~ **along**); **to** ~ *one's* **way into/to** *smth.* bir yerə soxulub gizlicə girmək; *They managed to wriggle (their way) through the thick hedge Onlar qalın çəpərdən keçə bildilər*; 3. *məc.* **(into)** girmək, soxulmaq, qılığına girmək; **to** ~ **into office** müəyyən bir vəzifəyə girmək; **to** ~ **into favour** qılığa girmək; 4. boyun qaçırmaq, canını/yaxasını qurtarmaq, başını qurtarmaq, çıxmaq **(out of)**; **to** ~ **out of a promise/an engagement** vəddən/ öhdəçilikdən boyun qaçırmaq; **to** ~ **out of a difficulty** çətin vəziyyətdən çıxmaq; *The Minister managed to wriggle out of answering the question Nazir suala cavab verməkdən boyun qaçırdı/yaxasını kənara çəkdi*

**wriggler** ['rɪgləʳ] *n* 1. ağcaqanad sürfəsi; 2. öz vəzifəsindən/borcundan /vədindən boyun qaçıran adam; 3. yaltaq/özünü hər yerə soxan adam; bic/fəsadçı/fitnə salan adam

**-wright** [-raɪt] *sənət adları bildirən mürəkkəb sözlərdə işlənir:* ship**wright** gəmiqayırma mütəxəssisi, gəmi qayıran; play**wright** dramaturq; wheel**wright** təkərçi, təkər qayıran/sazlayan usta

**wring**[1] [rɪŋ] *n* 1. sıxma, burma; *She gave the shirt a wring O, (yaş) köynəyi sıxdı*; 2. əl tutuşma/sıxma; 3. bərk ağrı, sancı *(xüs. bağırsaqlarda)*

**wring**[2] [rɪŋ] *v* (*pt, pp* **wrung** [rʌŋ]) 1. sıxmaq, burmaq; *He wrung the clothes (out) before putting them on the line to dry Qurumaq üçün kəndirə sərməmişdən əvvəl o, paltarları sıxdı*; 2. əl sıxmaq; əl vermək; **to** ~ *smb.'s* **hand** bir kəslə əl vermək; 3. sıxmaq, ağrıtmaq *(ayaqqabı)*; *My boot wrings the toe Çəkmə baş barmağımı sıxır*; 4. *məc.* üzmək; incitmək, iztirab vermək; *This sad story wrung his heart Bu qəmgin hekayət onun ürəyini üzdü; If I find the person who scratched my car, I'll wring his neck Mənim maşınımı cızan adamı tapsam, onun boğazını üzəcəm*; 5. zorla/hədələməklə/fırıldaqla almaq/ qoparmaq/məcbur etmək *(həm də* **to** ~ **out /from/out of**); **to** ~ **consent** güclə/zorla razılıq almaq; **to** ~ **a promise from** *smb.* bir kəsdən

zorla vəd almaq; 6. təhrif etmək; **to ~ words from their true meaning** sözlərin həqiqi mənasını təhrif etmək

**wringer** [ˈrɪŋəʳ] *n* paltarsıxan maşın;

◊ **to put *smb.* through the ~ 1)** bir kəslə çox sərt rəftar etmək *(xüs. sorğu-sual zamanı)*; **2)** boynuna almağa məcbur etmək; **3)** hədələmək-lə/ fırıldaqla pul qopartmaq; **4)** sıxıb suyunu çıxartmaq *(öz tabeliyində olanların və s.)*

**wrinkle¹** [ˈrɪŋkl] *n* I *(adət. pl)* 1. qırış *(üzdə, dəridə)*; **~s on the face** üzdə/sifətdə qırışlar; *She's beginning to get wrinkles around her eyes Onun gözlərinin ətrafında qırışlar əmələ gəlməkdədir*; 2. büzmə, qırçın, qat; **to iron out the ~s in a dress** paltardakı qırışları /büzmələri ütüləyib düzəltmək; **to fit without a ~** əynində yaxşı oturmaq, heç bir büzməsi və s. olmamaq; 3. çatışmazlıq, nöqsan, qüsur, eyib; **without spot or ~** ləkəsiz, qüsursuz, eyibsiz; 4. *geol.* qat *(yer səthində)*

**wrinkle** [ˈrɪŋkl] *n* II 1. xeyirli məsləhət yaxud eyham, him, işarə; *He put me up to a wrinkle or two O mənə nə isə bir-iki xeyirli məsləhət verdi*; 2. yeni bir fikir; yenilik, təzəlik; **the latest ~** son moda; *That's a new wrinkle Bu nə isə tamamilə yeni bir şeydir*

**wrinkle²** [ˈrɪŋkl] *v* 1. qırışmaq *(həm də* **to ~ up***)*; *The skin round her eyes wrinkled when she smiled O gülümsəyəndə onun gözlərinin ətrafındakı dəri qırışırdı/büzüşürdü*; 2. qırışdırmaq, büzüşdürmək; *He wrinkled (up) his forehead O, alnını qırışdırdı*; 3. büzülmək, büzüşmək; əzişdirmək; əzmək, büzmək, büzüşdürmək; *Her stockings were wrinkled Onun corabları büzüşmüşdü; The paper has wrinkled where it got wet Kağız islandığı yerdən büzüşmüşdü*; **to ~ a dress** paltarı əzmək

**wrinkled** [ˈrɪŋkld] *adj* 1. qırışmış; bürüşmüş; **his old ~ face** onun qoca bürüşmüş sifəti; 2. əzilmiş, qat kəsmiş *(paltar haq.)*; 3. *bot.* büzüşmüş; **~ peaches** büzüşmüş şaftalı/hulu

**wrinkling** [ˈrɪŋklɪŋ] *n* qırışma, büzüşmə, qırışlarla örtülmə; qırış-qırış/büzüş-büzüş olma; *Overexposure to the sun can cause premature wrinkling Həddən artıq özünü günə verma vaxtından əvvəl qırışlar yarada /törədə bilər*

**wrinkly** [ˈrɪŋklɪ] *adj* 1. qırış-qırış, qırışlı; büzülmüş; 2. əzik, büzüşmüş; **an old apple with a ~ skin** büzüşmüş köhnə alma

**wrist** [rɪst] *n* 1. bilək; *He took me by the wrist O mənim biləyimdən tutdu*; 2. manjet, qol köbəsi; 3. *tex.* sapfa *(oxun yaxud valın yataqda hərlənən hissəsi)*

**wrist-watch** [ˈrɪstwɔtʃ] *n* qol saatı

**wristband** [ˈrɪstbænd] *n* 1. manjet, qol köbəsi, köbə; 2. bilərzik, qolbaq

**wristlet** [ˈrɪstlɪt] *n* 1. bilərzik, qolbaq; 2. saat qayışı *(qol saatı üçün)*; 3. *pl jarq.* əl qandalı

**writ¹** [rɪt] *n* 1. *arx.* namə; 2. *hüq.* sərəncam/çağırış vərəqəsi; iddia/tələb ərizəsi; **to serve a ~ for libel on *smb.*** bir kəsə böhtan atıldığına görə məhkəməyə gəlmə vərəqəsi göndərmək; *The patient's solicitors issued a writ against the doctor Xəstənin vəkilləri həkimə qarşı iddia qaldırdılar*; **a ~ for the arrest of *smb.*** bir kəsi həbs etmək haqda sərəncam/əmr

**writ²** [rɪt] **to write** *felinin qədim pt, pp forması*

**write** [raɪt] *v (pt* **wrote** [rout] *arx.* **writ** [rɪt]; *pp* **written** [ˈrɪtn] *arx.* **writ** [rɪt]) 1. yazmaq; **to ~ a good (legible) hand** aydın /səlis/yaxşı xətti olmaq; **to ~ large/small /plain** iri/xırda/aydın yazmaq; **to ~ in ink/in pencil** mürəkkəblə/karandaşla yazmaq; **to ~ shorthand** stenoqrafiya ilə yazmaq; *Please write on both sides of the paper Zəhmət olmasa, vərəqin hər iki tərəfində yaz/yazın; He wrote his name on the blackboard O, adını lövhədə yazdı*; **to ~ a cheque** çek yazmaq; **to ~ an application** ərizə yazmaq; *He wrote me a cheque for £15 O mənə 15 funt sterlinqlik çek yazdı*; 2. yaratmaq, yazmaq, bəstələmək *(musiqi, əsər və s.)*; **to ~ for a living** yazıçı olmaq; **to ~ a book** kitab yazmaq; **to ~ a symphony** simfoniya bəstələmək/yazmaq; **to ~ out of *one's* head** öz başından yazmaq, özündən quraşdırmaq/icad etmək; **to ~ in/for papers** jurnalist olmaq; **to ~ for "The Times"** "Taymz" qəzetinin müxbiri olmaq, "Taymz" qəzetində əməkdaşlıq etmək; 3. ifadə etmək, göstərmək; *Fear is written on his face Onun sifətində qorxu yazılıb; There is detective written all over him Onun üzündən xəfiyyəlik yağır/tökülür*; 4. maşında yazmaq/çap etmək; 5. yazmaq üçün yararlı olmaq *(qələm, karandaş və s.)*; *This pen won't write Bu qələm yaramır*; **to ~ back** məktuba yazılı cavab vermək; **to ~ down 1)** yazmaq, qeyd etmək; **to ~ down an address/a telephone number** ünvanı/telefon nömrəsini yazmaq/qeyd etmək; 2) mətbuatda bir kəs haqqında etinasız yaxud mənfi fikir söyləmək; bir kəsin xidmətlərini azaltmaq *(qəzetdə)*; 3) *məc.* hesab etmək; təsvir etmək; *I wrote him down as a fool/as a shrewd fellow Mən onu axmaq/bic hesab etdim*; 6. *tic.* qiymətini aşağı salmaq, ucuzlaşdırmaq; *All the stocks over six months old were written down to 50% Altı aydan çox vaxtı keçmiş bütün malların qiyməti 50% aşağı salındı*; **to ~ for 1)** müxbir olmaq, qəzetdə əməkdaşlıq etmək; 2) məktubla çağırmaq; *We wrote for his mother Biz yazıb onun anasını çağırdıq*; **to ~ in 1)** daxil/əlavə etmək *(siyahıya, mətnə, blanka və s.)*; *We wrote in his name into the election list Biz onun adını seçki siyahısına daxil/əlavə etdik*; 2) doldurmaq *(anketi və s.)*; 3) *amer.* rəisə şikayət/ ərizə və s. vermək; 4) müraciət etmək *(seçki nümayəndələrinə və*



*s.)*; **to ~ off 1)** asanlıqla yazmaq; 2) haqq-hesabdan silmək; ləğv etmək *(borcu və s.)*; *The company wrote off the debts from the projects Kompaniya/Şirkət layihələrlə əlaqədar olan borcları hesabdan sildi*; 3) *məc.* əhəmiyyət verməmək, gözdən salmaq; hafizədən silmək; *I may have been beaten in this fight, but don't write me off yet – I'll be back Ola bilər ki, mən bu vuruşda uduzmuşam, ancaq hələ məni hesabdan silməyin – mən geri qayıdacağam*; 4) tamam sıradan çıxmaq, bərk əzilmək; *The driver escaped with minor injuries, but the car was completely written off Sürücü kiçik /yüngülvarı zədə ilə xilas oldu, lakin maşın tamam sıradan çıxmışdı*; **to ~ out** üzünü köçürtmək/ağartmaq; **to ~ out fair** üzünü tərtəmiz köçürtmək/ağartmaq; **to ~ out in full** tamamilə yazıb köçürtmək; *The policeman was writing out his report Polis nəfəri məruzəsini tamamilə köçürüb qurtarırdı*; **to ~ out a check** çek yazmaq; **to ~ over** təzədən köçürtmək; **to ~ up 1)** müfəssəl/ətraflı yazmaq/təsvir etmək; *Write up a diary Müfəssəl gündəlik yaz/yazın; Write up your lecture notes Mühazirə qeydlərini ətraflı/müfəssəl yaz/yazın; I'm writing up the play for the local paper Mən yerli qəzet üçün bir pyes yazıram*; 2) mətbuatda tərifləmək/çox şişirtmək; *The critic wrote up the acting of the leading players Tənqidçi baş rolları ifa edən aktyorların oyununu mətbuatda çox şişirtdi/təriflədi*; 3) yazıb qurtarmaq, sona yetirmək, bitirmək *(hesabat, gündəlik və s.)*; 4) tövsiyə etmək *(bir kəsə)*, məsləhət vermək *(müalicə kursu, istirahət və s. haq.)*; **to ~ *smb.* up for** tövsiyə etmək, məsləhət vermək *(müalicə və s. haq.)*

◊ **to ~ like an angel** çox bitkin/çox gözəl yazmaq *(xüs. xəttatlar haq.)*; **to ~ oneself out** yaradıcılıq qabiliyyətini itirmək *(yazıçı haq.)*; **to ~ oneself man/woman** hədd-büluğa çatmaq, yetişmək; **to ~ *one's* own ticket** külli miqdarda sərvəti olmaq; *He allowed the scientists to write their own ticket for research O, alimlərin elmi-tədqiqat işi üçün külli miqdarda pul buraxdı/verdi*

**write-down** [ˈraɪtˈdaun] *n tic.* nominal qiymətlərin aşağı salınması

**write-in¹** [ˈraɪtˈɪn] *n siya.* səsvermə sistemi **1)** *səs verən şəxsin siyahıda olmayan namizədin adını bülletenə daxil etməsi*; **2)** adı siyahıya əlavə daxil edilən namizəd

**write-in²** [ˈraɪtˈɪn] *adj*: **~ votes** siyahıda olmayan namizədə verilən səslər

**write-off** [ˈraɪtˈɔf] *n* 1. ləğv etmə; yazılı surətdə rədd etmə; 2. *pl müh.* haqq-hesabdan silinən məbləğ; 3. *d.d.* lazımsız/gərəksiz əmlak; brak, çıxdaş; qırıq-sökük; 4. qiymətlərin aşağı salınması, ucuzlaşdırma

**writer** [ˈraɪtəʳ] *n* 1. yazıçı; müəllif; **the present ~** bu sətirlərin müəllifi; **to be a ready ~** iti qələm sahibi olmaq; asan və tez yazmaq; 2. mirzə, klerk *(Qərbi Avropanın bəzi ölkələrində kontor xidmətçisi)*; **the 17th century ~s** 17-ci əsr yazıçıları/mirzələri; 3. *kino.* ssenarist, ssenari yazan;

◊ **~ to the signet** məhkəmə nəzarətçisi *(Şotlandiyada)*; **~'s cramp/palsy** *tib.* qıc; çəng, qıc/çəng olma; tutulma

**write-up** [ˈraɪtˈʌp] *n* 1. tərif, tərifləmə; həddindən artıq tərifləmə; 2. təsvir etmə *(hadisələri, xəstənin vəziyyətini və s.)*

**writhe** [raɪð] *v* 1. qovrulmaq, qıvrılmaq *(ağrıdan)*; **to ~ in agony** əzab-əziyyət içində qovrulmaq; 2. əzab/iztirab çəkmək; **to ~ with shame** xəcalətdən əzab çəkmək, bərk utanmaq; **to ~ under/at the insult** təhqirdən əzab-əziyyət çəkmək

**writing** [ˈraɪtɪŋ] *n* 1. yazı, cızma-qara; *I do a bit of writing in my spare time Mən boş vaxtlarımda bir azca cızma-qara edirəm*; **at the present ~** bu sətirlər yazılarkən; **in ~** yazılı şəkildə; **to commit to ~** kağızda yazmaq/ifadə etmək; **~ down** *tic.* məbləğin silinməsi *(ayağından)*; 2. *(ədəbi)* əsər; **the ~s of Dickens** Dikensin əsərləri; 3. sənəd; 4. xətt; *His writing is difficult to read Onun xəttini oxumaq çətindir*; 5. üslub, forma *(ədəbi əsərdə)*; yazı tərzi; **good/bad ~** yaxşı/pis üslub *(əsərdə)*;

◊ **the ~ on the wall 1)** *inc.* divarda yazı işarələri, qədim hərflər/yazılar; 2) pis/məşum əlamət

**writing-case** [ˈraɪtɪŋkeɪs] *n* yazı ləvazimatı üçün neseser *(qutu)*

**writing-desk** [ˈraɪtɪŋdesk] *n* = **writing-table**

**writing-ink** [ˈraɪtɪŋˈɪŋk] *n* mürəkkəb

**writing-master** [ˈraɪtɪŋ.ma:stəʳ] *n* hüsnxətt müəllimi

**writing-materials** [ˈraɪtɪŋmə.tɪərɪəlz] *n pl.* yazı ləvazimatları

**writing-pad** [ˈraɪtɪŋpæd] *n* bloknot

**writing-paper** [ˈraɪtɪŋ.peɪpəʳ] *n* yazı /poçt kağızı

**writing-table** [ˈraɪtɪŋ.teɪbl] *n* yazı stolu/masası

**written¹** [ˈrɪtn] *adj* yazılı, yazılmış; **~ invitation/reply** yazılı dəvət/cavab; **~ evidence** yazılı sübut; **~ law** yazılmış qanun; **~ badly/quickly /well** pis/tez/yaxşı yazılmış; **~ in the dust/ sand/ wind 1)** naməlum, tanınmamış *(ad haq.)*; **2)** keçici, ötəri *(şöhrət haq.)*

**written²** [ˈrɪtn] **to write** *felinin pp forması*

**wrong¹** [rɔŋ] *n* 1. səhv, yanlışlıq, düzgün/doğru olmama; yanılma; *He doesn't know the difference between right and wrong O, düz ilə səhv arasında fərq bilmir/görmür; Her estimates of the cost was completely wrong Onun qiymət haqqındakı fikirləri tamam səhv/yanlış idi*; to

do ~ səhv etmək, yanılmaq; **to be in the ~** ədalətli/haqlı olmamaq; səhv etmək; 2. pislik, yamanlıq, pis iş, şər; ədalətsizlik, haqsızlıq; *They have done us a great wrong Onlar bizə çox yamanlıq/ədalətsizlik ediblər; She complained of the wrongs she had suffered O, çəkdiyi haqsızlıqlardan şikayətləndi*; **to do ~ to** ***smb.*** bir kəsə pislik/yamanlıq etmək; **to put** ***smb.*** **in the ~** günahı/təqsiri bir kəsin üzərinə yıxmaq; *He admitted that he was in the wrong O, ədalətsiz olduğunu boynuna aldı*; **to make ~ right** ≅ ağa qara demək; **to right a ~** şəri/ədalətsizliyi aradan qaldırmaq; 3. *hüq.* qanunu pozma, qanun pozğunluğu, cinayət; *It is wrong to steal Oğurlamaq cinayətdir*; **private ~s** şəxsi adamların maraq və qanuni hüquqlarının pozulması; **public ~s** dövlət /ictimai hüquqların və maraqların pozulması;

◊ *The dead are always wrong at. söz. Təqsir öləndə olar*

**wrong[2]** [rɔŋ] *adj* **1.** səhv, yanlış, saxta; **a ~ answer/opinion** səhv/yanlış cavab/fikir; *He did the sum but got the wrong answer O yekun vurdu, lakin səhv cavab aldı*; **~ statement** yanlış bəyanat; **~ note** *mus.* saxta not; *We got into the wrong train Biz başqa qatara minmişdik*; **a ~ move 1**) səhv/yanlış addım; **2**) yanlış gediş *(şahmatda)*; **to get the ~ number** səhv/yanlış nömrə yığmaq *(telefon haq.)*; *My watch is wrong Mənim saatım düz deyil/ düzgün işləmir; I can prove you are wrong Mən sübut edərəm ki, sən/siz haqlı deyilsən/deyilsiniz*; **to be quite ~** tamam yanılmaq, çox bərk səhv etmək; **to go ~ 1**) düz yoldan sapmaq; mənəvi cəhətdən pozulmaq; **2**) heç bir şey alınmamaq, heç bir şey çıxmamaq; *Everything went wrong Heç nə alınmadı*; 2. pis, şər, yaman, ədalətsiz; *Telling lies is wrong Yalan danışmaq/demək pis şeydir; You were wrong not to have mentioned it Onu qeyd etməməkdə sən/siz ədalətsiz /pis iş görmüsən/ görmüsünüz*; **3.** münasib/ əlverişli olmayan, namünasib; *This is the wrong time to make a visit Səfərə çıxmaq üçün bu münasib vaxt deyil; He's a good actor, but this is the wrong part for him O yaxşı aktyordur, lakin bu rol onun üçün münasib deyil*; **at the ~ time** namünasib /əlverişsiz vaxtda; *What's wrong with a cup of coffee? Bir fincan kofeyə nə deyərsən?/deyərsiniz?; What's wrong with it?* **1**) *Ona nə olub ki?* **2**) *Burada nə var ki?* **4.** astar tərəf, tərsinə olan; *This is the wrong side of the table cloth Bu, süfrənin astar tərəfidir*; **~ side out** tərs/astar üzünə, tərsinə; **5.** nasaz, ovqatı təlx, əhvalı pis; *You look upset; is anything wrong? Sənin/Sizin ovqatın/ovqatınız təlxdir; nə isə xoşagəlməz bir şeymi olub?; The baby won't stop crying – I hope, there's something wrong with him Uşaq ağlamağını kəsmir/dayandırmır – yəqin ki, nasazdır/ona nəsə olub*; **6.** pozğun, nasaz, xarab; *Something is wrong with my watch Saatım nə isə xarab olub; My liver is wrong Qaraciyərim nə isə bir balaca pozulub; What's wrong with the engine? It's making an awful noise Mühərrikə nə olub? O, nə isə dəhşətli səs çıxarır*;

◊ **back the ~ horse** hesabda yanılma/səhv etmə; **born on the ~ side of the blanket** bir-biri ilə qeyri-qanuni izdivacda olan valideynlərdən doğulan; bic olan, qeyri-qanuni doğulan; **to go ~ 1**) yolunu azmaq, günah etmək, günaha batmaq; düşkünləşmək, səfalətə yuvarlanmaq *(mənəvi cəhətdən)*; **2**) baş tutmamaq, işi gətirməmək; *Everything went wrong Heç nə baş tutmadı, İş düz gətirmədi*; **3**) sıradan çıxmaq *(maşın və s.)*; **to get hold of the ~ end of the stick** tamam səhv fikirdə olmaq, düzgün başa düşməmək, tərsinə başa düşmək; *You've got the wrong end of the stick – he doesn't owe me money, I owe him Sən/Siz düzgün başa düşməmisən/düşməmisiniz – o mənə pul borclu deyil, mən ona borcluyam*; **to get off on the ~ foot** pis təəssürat yaratmaq; *He got off on the wrong foot by being rude to his boss O, sahibkarına qarşı kobud olduğuna görə pis təəssürat yaratmışdı*; **not far ~** demək olar ki, haqlı/doğru; *You are not far wrong Bəli, bu belədir, sən/siz az ya çox dərəcədə haqlısan/ haqlısınız*; **to get out of bed on the ~ side** ovqatı təlx olmaq; **to be born on the ~ side of the tracks** *amer.* kasıb ailədə anadan olmaq, aşağı təbəqədən çıxmaq; **on the ~ side of fifty** yaşı əllini ötmə, əllidən çox yaşı olma

**wrong[3]** [rɔŋ] *v* **1.** pislik/yamanlıq etmək, ziyan/zərər vurmaq, zərər yetirmək *(bir kəsə)*; **2.** ədalətsiz olmaq; pis niyyətdə olmaq *(bir kəsə qarşı)*; *He wronged me when he said that I was envious O mənə paxıl deməklə çox ədalətsizlik/insafsızlıq etdi*; **3.** biabır/rüsvay etmək; böhtanlamaq, böhtan atmaq; şərəfinə toxunmaq, namusunu ləkələmək *(qadının)*, yoldan çıxartmaq; **4. (of)** əlindən almaq; məhrum etmək *(aldatmaqla, güclə)*

**wrong[4]** [rɔŋ] *adv* **1.** səhv, yanlış; *You've spelt my name wrong Sən/Siz mənim adımı səhv yazdın/ yazdınız*; **to answer ~** səhv/yanlış cavab vermək; *I'm afraid you got me wrong Qorxuram ki, məni səhv başa düşmüş olasan/olasınız; Don't get me wrong d.d. Məni səhv başa düşmə/düşməyin*; **2.** sıradan çıxan, xarab olan; *The car radio has gone wrong again Maşının radiosu yenə də sıradan çıxıb/xarab olub*; **3.** ədalətsiz olaraq, düzgün olmayaraq; *It would be wrong to punish him Onu cəzalandırmaq ədalətsizlik olardı; You are treating him all wrong Sən/Siz onunla düzgün rəftar etmirsən/etmirsiniz;*



◊ *All our plans went wrong Bizim bütün planlarımız alt-üst oldu/boşa çıxdı; My digestion has gone wrong Mənim mədəm pozulub*; **to get in ~ with** ***smb.*** bir kəsin gözündən/etibarından düşmək; **to get** ***smb.*** **in ~** bir kəsi zərbə altında qoymaq

**wrongdoer** [ˈrɔŋˈduəʳ] *n* **1.** ürəksındıran/adamincidən/ təhqirədən *(adam)*; **2.** *hüq.* qanun pozan, cinayətkar, cani; **3.** günahkar/ günah edən adam

**wrongdoing** [ˈrɔŋduːɪŋ] *n* **1.** günah, suç, təqsir, xəta, qəbahət, nalayiq/yaramaz hərəkət; **2.** cinayət, qanun pozuntusu; *They found no evidence of wrongdoing Onlar heç bir qanun pozuntusu tapmadılar*

**wrongful** [ˈrɔŋful] *adj* **1.** ədalətsiz, düzgün olmayan; **2.** zərərli, ziyanlı, qəbahətli, xətalı; **3.** qeyri-qanuni, cinayətkar, qanunu pozan; **~ dismissal** qeyri-qanuni işdən çıxarma; *He sued his employer for wrongful dismissal Qanunsuz olaraq işdən çıxarıldığına görə o, müəssisə sahibini məhkəməyə verdi*

**wrong-headed** [ˈrɔŋˈhedɪd] *adj* **1.** səhv edən, yanılan, yanlış fikirdə inadcıllıq göstərən/edən; **~ students** yanlış düşünən tələbələr; **2.** səhv, dolaşıq, qarışıq, yanlış; **~ ideas** yanlış/dolaşıq/qarışıq fikirlər

**wrote** [rout] **to write** *felinin pt forması*

**wrought-up** [ˈrɔːtˈʌp] *adj* əsəbi, əsəbiləşdirilmiş; gərginləşdirilmiş; **~ nerves** gərginləşmiş əsəblər; **~ state** əsəbi vəziyyət; **to get ~ over nothing** heç nədən ötrü özündən çıxmaq

**wrung** [rʌŋ] **to wring** *felinin pt, pp forması*

**wry** [raɪ] *adj* **1.** əyri, çəp, əyilmiş; **a ~ nose** əyri burun; **a ~ look** çəp baxış; **to make a ~ face** üzgözünü turşutmaq *(nifrətdən)*; **a ~ smile** çəp/qeyri-səmimi təbəssüm; **2.** qeyri-ciddi, zidd, bir-birinə uymayan/ düz gəlməyən, təhrif olunmuş *(fikir haq.)*

**wry-neck** [ˈraɪnek] *n* **1.** *zool.* baltadimdik *(balaca oxuyan quş)*; **2.** *tib.* əyriboyun *(adam)*

**wych-elm** [ˈwɪtʃelm] *n bot.* dağ qarağacı, nahamar qarağac

**wye** [waɪ] *n* **1.** "Yy" hərfinin adı; **2.** *d.y.* döndərici dairə; **3.** *tex.* üçlük

**Wykehamist** [ˈwɪkəmɪst] *n* Vinçester kollecinin tələbəsi

# Xx

**X**[1], x [eks] *n (pl* **X's, x's** ['eksız]) *ingilis əlifbası-nın 24-cü hərfi*

**X**[2], x [eks] *n* 1. 10 sayını göstərən rum rəqəmi; 2. *riyaz.* iks, naməlum kəmiyyət; 3. *məc.* müəmma, nə isə sirli, əsrarəngiz yaxud naməlum şey; 3x=x+x+x; 4. naməlum şəxs; **Mr. X** Mistır X; 5. *amer.* on dollar *(kağız pul)*; 6. öpüş *(məktubun sonunda yazılır)*; **love and xxxx** sevirəm və çox-çox öpürəm; 7. forma etibarilə "x" xatırladan şey *(mürəkkəb sözün komponenti kimi və s.)*; 8. yazılı işdə səhvi göstərən işarə

**Xanthippe** [zæn'θıpı] *n* 1. Ksantippa *(Sokratın arvadı)*; 2. *məc.* deyingən/davakar/dalaşqan /cəncəl adam

**xanthous** ['zænθəs] *adj* sarı, sarımtıl

**X-axis** ['eks'æksıs] *n riyaz.* absis oxu

**X-bit** ['eksbıt] *n* qazıma maşınının xaçşəkilli baş hissəsi

**X-bracing** ['eks.breısıŋ] *n tex.* xaçşəkilli qovuşmalar/rabitələr

**xebec** ['zi:bek] *n tar.* şəbəkə *(Aralıq dənizi rayonunda yelkənli gəmi tipi)*

**X-engine** ['eks.endʒın] *n tex.* x-şəklində olan silindri mühərrik

**xenia** ['zi:nıə] *n pl* kseniya, qonaqlara hədiyyə *(qədim Yunanıstanda və Romada)*

**xenial** ['zi:nıəl] *adj* qonaqpərəstliyə aid olan, qonaqpərəstliklə bağlı olan; **~ customs** qonaqpərəstlik adətləri/ qanunları

**xenogamy** [zi:'nɔgəmı] *n bot.* çarpazvari tozlama/tozlanma

**xenon** ['zenɔn] *n kim.* ksenon *(kimyəvi element)*

**xenophobia** [.zenəu'fəubıə] *n* xaricilərə qərəzli/bədxah münasibət

**xerox** ['zıərɔks] *n* 1. kseroks *(foto ilə surətini çıxaran cihaz)*; 2. fotokopiya *(foto ilə alınmış surət)*

**xerophagy** [zıə'rɔfədʒı] *adj* quru/yavan yemək

**xerophyte** ['zıərəfaıt] *n bot.* kserofit *(quru və susuz yerlərdə bitən bitki)*

**X-line** ['ekslaın] *n riyaz.* absis oxu, ikslər oxu

**Xmas** ['krısməs] *n* **Christmas** *sözünün qısa forması*

**X-radiation** ['eksreıdıeıʃn] *n* rentgen şüaları ilə şüalanma

**X-ray**[1] ['eks'reı] *n* 1. *(pl* **-s**) rentgen şüaları; *The doctor studied the X-rays Həkim rentgenoqramı oxudu; Go for an X-ray Rentgen şüasından keç/keçin*; **to take an ~ of *smb.'s* hand** bir kəsin əlinin rentgenoqramını çıxartmaq; 2. rentgenoqram *(rentgen şüaları vasitəsilə fotoqraf lövhəsində alınmış şəkil)*; **a chest ~** döş qəfəsinin rentgenoqramı

**X-ray**[2] ['eks'reı] *adj* rentgen; **~ therapy** rentgenoterapiya *(rentgen şüaları ilə müalicə)*; **~ picture** rentgenoqram; **~ photograph** rentgen vasitəsilə alınan şəkil; **an ~ machine** rentgen maşını

**X-ray**[3] ['eks'reı] *v* 1. işığa/rentgenə salmaq, rentgenlə yoxlamaq; *Have one's lungs X-rayed Ciyərlərini rentgenə sal/salın*; 2. rentgen şüası vermək

**XX** ['eksız] *n* 1. *amer.* iyirmi dollar *(kağız)*; 2. **double-cross** *jarq.* aldatma *(xüs. öz həmkarını və s.)*; satqınlıq; *I know you gave me the XX Mən bilirəm, sən/siz məni satmısan/satmısınız*

**xylanthrax** [zaı'lænθræks] *n* ağac kömürü

**xylograph** ['zaıləgra:f] *n* ağac üzərində oyma

**xylography** [zaı'lɔgrəfı] *n* ksiloqrafiya *(ağac üzərində naxış açma sənəti)*

**xylonite** ['zaılənaıt] *n* sellüloid

**xylophone** ['zaıləfəun] *n* ksilofon *(kiçik qutu üzərinə bənd edilmiş ağac lövhəciklərdən ibarət, toxmacıqlarla çalınan musiqi aləti)*



# Yy

**Y**[1], y [waı] *n (pl* **Y's, y's** [waız]) *ingilis əlifbasının 25-ci hərfi*

**Y**[2] [waı] *n* 1. *riyaz.* iqrek, naməlum ədəd/kəmiyyət; x=y+4; 2. naməlum ikinci şəxs; *Mr X met Miss Y Cənab x xanım y -a rast gəldi*; 3. forma etibarilə "y" hərfini xatırladan şey; haça

**Y**[3] [waı] *adj* y hərfinə oxşayan; çəngələoxşar; haça; **Y-road** haça yol

**yacht**[1] [jɔt] *n* yaxta *(motorlu yaxud yelkənli yüngül gəmi/qayıq)*; **a ~ crew/race** yaxta ekipajı/yarışı

**yacht**[2] [jɔt] *v* üzmək, yaxtada üzmək

**yacht-club** ['jɔtklʌb] *n* yaxta-klub *(su idmanı ilə məşğul olan idman təşkilatı)*

**yachting** ['jɔtıŋ] *n* yelkənli qayıq idmanı *(həm də* **~ sport)**; **to go ~** yelkənli idmanla məşğul olmaq

**yachtsman** ['jɔtsmən] *n (pl* **-men** [-mən]) 1. yaxta sahibi; 2. *id.* yaxtsmen *(yaxtada su idmanı ilə məşğul olan idmançı)*

**yager** ['jeıgə'] *n* 1. ovçu; yeqer; 2. *arx.* yeqer, yeqer dəstəsinin əsgəri *(alman və Avstriya ordusunda)*; nişançı

**yaffil, yaffle** ['jæfl] *n zool.* yaşıl ağacdələn

**yah** [ja:] *inter* hə də? yox a! *(kinayə, nifrət bildirir)*

**yahoo** [ja:'hu:] *n (pl* **-oos**) 1.iyexi *(C.Sviftin "Qulliverin səyahəti" əsərində işlətdiyi söz)*; 2. *məc.* heyvan, murdar adam/məxluq; 3. *amer. kin.* kəndli-kütlü, avam/kobud/qanmaz adam

**yak** [jæk] *n zool.* yak, qaytaq, sarlıq *(Tibet öküzü)*

**Yakut** [jæ'kut] *n* 1. yakut *(xalq)*; 2. Yakut dili

**yak-yak** ['jækjæk] *v jarq.* çərənləmək, boşboğazlıq etmək

**Yale** [jeıl] *n* Yeyl Universiteti *(həm də* **~ University)**

**yale lock** ['jeıllɔk] *n* avtomat "amerikan" qıfılı

**yammer** ['jæmə'] *v amer. d.d.* 1. şikayətlənmək, daim inləmək/sızlamaq, ah-vay etmək; *They kept yammering an about hour how expensive everything was Onlar hər şeyin necə də baha olması haqqında bir saat ah-vay etdilər / şikayətləndilər;* 2. boşboğazlıq etmək, çərənləmək, çənə vurmaq, gic-gic danışmaq

**yank**[1] [jæŋk] *n d.d.* I yanki *(avropalıların ABŞ-da doğulmuş amerikanlara verdiyi ad)*

**yank** [jæŋk] *n amer.* II dartınma; dartma; silkinmə; sıçrayış, sıçrama

**yank**[2] [jæŋk] *v* 1. dartmaq, bərk dartmaq; *She yanked (on) the rope and it broke O, ipi bərk dartdı və ip qırıldı*; 2. *məc.* bərk fəaliyyətdə olmaq, çox çalışmaq, işlə çox məşğul olmaq

**Yankee** ['jæŋkı] *n (həm də* **Yank)** 1. yanki, amerikalı; 2. *amer.* yeni İngiltərənin sakinləri; 3. yanki, şimallı *(Amerikanın şimal ştatlarından birisinin sakini)*; 4. *tar.* yanki, şimal ordusunun əsgəri *(vətəndaş müharibəsində 1861-1865)*; 5. *d.d.* yeni İngiltərədə yayılmış ingilis ləhcəsi;

◊ **~ Doodle 1)** "Yanki Dudl" *(müstəqillik uğrunda gedən müharibə vaxtının nəğməsi)*; 2) amerikalı; **to sell out to the ~s** *amer. dial.* 1) xəstəxanaya düşmək; 2) bədbəxt hadisənin qurbanı olmaq; 3) cənubdan şimala köçmək *(ABŞ-da)*

**Yankeefied** ['jæŋkıfaıd] *adj* amerikanlaşmış

**yap**[1] [jæp] *n* 1. hürmə, vəngildəmə; **to give a ~** vəngildəmək, hürmək; 2. *d.d.* çərənləmə, boşboğazlıq etmə; 3. *sl.* boğaz, udlaq; ağız; **to open *one's* ~** ağzını açmaq, qışqırmağa başlamaq; söyüşmək, söyüş yağdırmaq, söymək; 4. *jarq.* xuliqan, gəda, ədəbsiz

**yap**[2] [jæp] *v* 1. bərkdən hürmək/vəngildəmək; 2. *d.d.* çərənləmək, boşboğazlıq etmək; *Stop yapping! Çərənləməyi kəs/kəsin*; 3. *sl.* söymək; söyüşmək

**yapp** [jæp] *n* yumşaq dəri cild

**yard**[1] [ja:d] *n* I 1. yard *(91,44 sm-ə bərabər ingilis uzunluq ölçüsü)*; *We live only a few yards from the bus station Biz avtobus vağzalından bir neçə yard məsafədə yaşayırıq*; 2. *şair.* qarış; **to fight for every ~** torpağın hər bir qarışı uğrunda çarpışmaq/vuruşmaq; 3. *dən.* rey *(gəmidə yelkənlərin asılması üçün üfüqi ağaclar)*; 4. *d.d.* badə, krujka, uzun/dar stəkan; **~ of wine** bir badə şərab; **~ of ale** bir krujka pivə

**yard** [ja:d] *n* II 1. həyət; **the prison ~** dustaqxana həyəti; *The children were playing in the yard Uşaqlar həyətdə oynayırdılar*; 2. *amer. arx.* bağ; **front ~** kiçik bağça; 3. meşə, odun anbarı; 4. *d.y.* park; 5. ağıl *(mal-qara üçün)*; **a cattle ~** mal-qara üçün ağıl; 6. qəbiristanlıq; 7. meydança, həyət *(iş, biznes üçün)*; 8. **the Y = Scotland Yard**

**yard**[2] [ja:d] *v* 1. salmaq *(heyvanları həyətə)*; 2. daşımaq, gətirmək *(ağacı tədarük edildiyi yerdən yolun yanına)*; 3. qışlağa/arana dönmək /qayıtmaq

**yard-bird** ['ja:dbə:d] *n hərb. d.d.* yeni/təzə əsgər *(əsgərliyə yeni alınmış)*

**yard-man** ['ja:dmən] *n (pl* **-men** [-mən]) 1. *d.y.* depo fəhləsi; 2. anbar müdiri

**yard-master** ['ja:d.ma:stə'] *n. d.y.* 1. stansiya dispetçeri; 2. qatar tərtibatçısı

**yard-measure** ['ja:d.meʒə'] *n* ölçü lenti, ruletka *(dəmir və ya yığılan)*

**yardsman** ['ja:dzmən] *n* = **yardman**

**yard-stick** ['ja:dstık] *n* 1. = **yard-measure**; 2.

*məc.* ölçü, ölçü vahidi; meyar; **a ~ of comparison** müqayisə meyarı; *Success is not to be measured by the yardstick of the dollar Dollar müvəffəqiyyət meyarı olmamalıdır. Müvəffəqiyyət dollarla ölçülməməlidir;*

◊ **to measure/to judge others by one's own ~** ≅ başqalarını öz arşını ilə ölçmək

**yard-wand** ['ja:dwɔnd] *n* = **yard-stick**[1]

**yarn**[1] [ja:n] *n* 1. iplik; **cotton ~** pambıq iplik; **mending ~** gözəmə üçün sap; **fingering ~** əllə toxumaq üçün iplik; 2. *d.d.* (uzun) hekayə; nağıl; anekdot, lətifə, qaravəlli; **to spin a ~(s)** nağıl/hekayə danışmaq, özündən toxumaq/uydurmaq

**yarn**[2] [ja:n] *v* nağıl danışmaq, uydurmaq, çərənləmək

**yarn-beam** ['ja:nbi:m] *n* toxucu dəzgahında üzərinə əriş salınan val

**yarn-dyed** ['ja:ndaɪd] *adj toxuc.* iplik halında boyanmış, boyanmış iplik

**yarn-spinner** ['ja:n.spɪnəʳ] *n* 1. əyirici, iplik əyirən fəhlə; 2. *məc.* müxtəlif hekayətləri danışmağı sevən adam *(öz sərgüzəştləri və s. haq.)*

**yarn-windle** ['ja:nwɪndl] *n toxuc.* kələf açan alət

**yarovization, -sation** [.jærəvaɪ'zeʃn] *n k.t.* yarovizasiya *(bar vermə prosesini tezləşdirmək, məhsuldarlığı yüksəltmək üçün bitki toxumlarının xüsusi olaraq işlənməsi)*

**yarovize, -ise** ['jærəvaɪz] *v* yarovizasiya etmək

**yarrow** ['jærou] *n bot.* boymadərən, qanotu

**yashmak** ['jæʃmæk] *n* 1. yaşmaq; 2. pərəncə, çadra

**yataghan** ['jætəgən] *n* yatağan *(əyri türk qılıncı)*

**yaw**[1] [jɔ:] *n dən. av.* hərəkət istiqamətində sapma; axtarma, manevr etmə

**yaw**[2] [jɔ:] *v* 1. *av.* kursundan sapmaq, marşrutdan/yolundan çıxmaq/sapmaq; 2. *dən.* axınla üzmək

**yawl**[1] [jɔ:l] *n dən.* yal *(yük daşımaq üçün qısa və enli qayıq)*

**yawl**[2] [jɔ:l] *v dial.* qışqırmaq, bağırmaq, fəryad etmək; ulamaq *(it və s.)*

**yawn**[1] [jɔ:n] *n* 1. əsnəmə; 2. *tex.* ara, aralıq, deşik; 3. *şair.* quyu, uçurum; **the ~ of hell** cəhənnəm quyusu

**yawn**[2] [jɔ:n] *v* 1. əsnəmək, əsnətmək; **to make smb. ~** bir kəsi əsnətmək; *He yawned good night Əsnəyərək, o, xoş gecə arzuladı;* **to make smb. ~** bir kəsi əsnətmək; 2. açılmaq; ağzını açmaq; *The hole yawned before him Onun qarşısında bir deşik açıldı;* 3. geniş açılmaq/aralanmaq; *The graves yawned Qəbirlər aralanmışdı*

**yawning** ['jɔ:nɪŋ] *adj* 1. əsnəyən; 2. açılan, aralanan, görünən; **~ chasm** görünən uçurum;

◊ **a ~ gap/gulf** dərin uçurum/fərq; **a ~ gap between the rich and poor** dövlətlilər və kasıblar arasında dərin uçurum

**yaw-yaw** ['jɔ:'jɔ:] *v* yuxarıdan danışmaq, təkəbbür satmaq, təkəbbürlənmək

**Y-axis** ['waɪ'æksɪs] *n riyaz.* ordinat oxu *(analitik həndəsədə: bir nöqtədən horizontal kordinatın oxuna endirilən perpendikulyar)*

**yea**[1] [jeɪ] *n* 1. razılıq, müsbət cavab; 2. *amer.* lehinə səs; **~s and nays** adbaad səsvermə; *His motion was defeated by a vote of 29 yeas to 32 nays Onun təklifi 29 lehinə, 32 səs əleyhinə olmaqla rədd edildi/qəbul edilmədi; The yeas were 120, the nays 60 Lehinə 120, əleyhinə 60 səs verildi;*

◊ *Let your yea be yea Öz sözünün/sözünüzün üstündə dur/durun*

**yea**[2] [jeɪ] *adv* 1. hə, bəli; 2. *arx.* hətta daha çox; *I will give you a pound, yea two pounds Mən sənə/sizə bir funt, hətta daha çox – iki funt da verərəm*

**yean** [ji:n] *v* quzulamaq *(qoyun)*, balalamaq *(pişik)*

**yeanling** ['ji:nlɪŋ] *n* quzu; çəpiş

**year** [jə:, jɪə] *n* 1. il; **this/last/next ~** bu/keçən/gələn il; *I shall be 15 this year Bu il mənim 15 yaşım olacaq;* **in the ~ 1993** 1993-cü ildə; *I arrived three years ago Mən üç il bundan əvvəl gəlmişəm; They're getting married in a year's time Bir il müddətinə onlar evlənəcəklər;* 2. təqvim ili; **academic/school ~** tədris ili; **fiscal ~** büdcə /maliyyə ili; 3. *pl* yaş; *He is old/young for his years O, yaşına görə qoca/cavan görsənir; He is 30 years old Onun 30 yaşı var; He died in his sixtieth year O, altmış yaşında öldü;* 4. *pl* uzun müddət; *I've worked in this firm for years (and years) Mən bu firmada uzun müddət işləmişəm;* **~ by ~** ilbəil, hər il; **~ in ~ out** ildən ilə; **from ~ to ~, ~ by ~, ~ after ~** hər il; **~/and ~ ago** çoxdan, uzun illərdən bəri, əbədi, bütün ömrü boyu; **all (the) ~ round** bütün il boyu; *He swims in the sea all year round O bütün il boyu dənizdə üzür/çimir;*

◊ **Donkey's ~s** uzun müddət, ≅ it ili; **man /woman etc. of the ~** ilin kişisi/qadını; ilin birinci/qabaqcıl adamı; **not/never in a hundred, etc. ~s** ömründə, heç vaxt; *I'd never have thought of that in a million years Mən o haqda ömrümdə heç vaxt belə düşünməzdim; The illness put years on him Xəstəlik onu yaşlı göstərir; Giving up smoking has taken years off her Papirosu atandan sonra o gəncləşmişdi;* **the ~ dot** çox illər/uzun müddət, çoxdan; *I've been going there every summer since the year dot Uzun müddətdən bəridir ki, mən hər yay ora gedirəm;* **in the ~ of grace/of our Lord/of 1995** 1995-ci ilin milad bayramında; *A Happy New Year! Yeni iliniz mübarək!*

**year-book** ['jə:buk] *n* salnamə; illik/ildə bir dəfə çıxan məcmuə/jurnal

**yearling**[1] ['jə:lɪŋ] *n* 1. illik, bir illik heyvan, bir yaşar heyvan; 2. ting(ə), şitil, qələm; 3. *amer. hərb. sl* 1) çağırışçı *(əsgərliyə getməli olan adam)*; 2) *amer. hərb. jarq.* hərbi məktəbin birinci kurs kursantı/tələbəsi



**yearling**[2] ['jə:lɪŋ] *adj* birillik, biryaşlı, biryaşar

**yearlong** ['jə:lɔŋ] *adj* birillik, bir il davam edən

**yearly**[1] ['jə:lɪ] *adj* hər ilki, illik, ildə bir dəfə olan; **~ conference/holiday** İldə bir dəfə olan konfrans/bayram; **~ income** illik gəlir; **~ output** illik məhsul

**yearly**[2] ['jə:lɪ] *adv* hər il, ildə bir dəfə

**yearn** [jə:n] *v* 1. **(for, after)** həsrət çəkmək, qəribsəmək, qüssələnmək, xiffət etmək, kədərlənmək, darıxmaq; *He yearned to return to his native land O öz doğma vətəninə qayıtmağın həsrətini çəkirdi; He yearned for his family O, ailəsi üçün darıxırdı;* 2. **(for, to)** can atmaq, cəhd etmək; **to ~ for rest** rahatlığa /istirahətə can atmaq, rahatlıq istəmək; *The child yearned to be out of doors Uşaq təmiz havaya çıxmağa can atırdı;* **to ~ to be free** azad olmağın həsrətini çəkmək

**yearning** ['jə:nɪŋ] *n* həsrət, arzu; dilək; bərk xiffət, darıxma, qəribsəmə; **popular ~s** xalq diləyi/arzusu

**yeast** [ji:st] *n* maya, acıtma, balatı

**yeasty** ['ji:stɪ] *adj* 1. köpüklü, köpüklənən; 2. acıyan; mayalı; acıtmalı; 3. boş, mənasız *(söz və s. haq.)*

**yegg** [jeg] *n amer.* evyaran oğru, soyğunçu, çapovulçu

**yelk** [jelk] *n* = **yolk**

**yell**[1] [jel] *n* 1. qulaqbatırıcı /güclü/şiddətli səs; **a ~ of terror** qorxu qışqırığı; **let out an ear-splitting yell** qulaqbatırıcı səslə qışqırmaq; 2. *amer.* bəyənmə, təqdir etmə nidaları *(kolleclərdə tələbə idman yarışlarında çıxarılan tədqir qışqırığı)*

**yell**[2] [jel] *v* 1. çığırmaq, bağırmaq, fəryad /fəğan etmək; **(to ~ out) to ~ out in pain/with fear** ağrıdan/qorxudan qışqırmaq/fəryad etmək; *Stop yelling! Çığırmağı kəs/kəsin!;* **to ~ at smb. for smth.** bir şey üçün bir kəsin üstünə qışqırmaq; *His wife is always yelling at him for being drunk Sərxoş olduğu üçün arvadı həmişə onun üstünə qışqırır;* **to ~ out curses** lənətlər yağdırmaq 2. ulamaq, zingildəmək *(it və s. haq.)*;

**yellow**[1] ['jeləu] *n* 1. sarılıq, sarı rəng; 2. yumurta sarısı; 3. *d.d.* qorxaqlıq, rəzillik; 4. *pl kin.* sarı irq

**yellow**[2] ['jeləu] *adj* 1. sarı; **~ dresses/leaves** sarı paltarlar/yarpaqlar; **the ~ race** sarı irq; **~ metal** sarı metal *(qızıl, latun)*; **~ disease** saralma xəstəliyi *(yarpaqlarda)*: **~ plague/sickness** *tib.* sarılıq, sarılıq xəstəliyi; **~ earth** sarı gil; 2. *d.d.* qorxaq, ağciyər; alçaq, rəzil; *He has a yellow streak in him O qorxaqdır/ağciyərdir;* 3. *arx.* paxıl; qısqanc; şübhəli *(baxış və s. haq.)*;

◊ **the ~ press** sarı mətbuat, küçə mətbuatı; **~ journalist** bulvar jurnalisti; **~ ticket** fahişə, qəhbə; **~ flag** karantin bayrağı

**yellow**[3] ['jeləu] *v* 1. saralmaq; *The manuscript had/was yellowed with age Zaman əlyazmasını saraltmışdı;* 2. saraltmaq, sarı rəngə boyamaq

**yellowback** ['jeləubæk] *n* 1. ucuz bulvar romanı; 2 fransız romanı *(sarı cilddə)*

**yellow-bark oak** ['jeləuba:k'əuk] *n bot.* zərif qabıqlı palıd ağacı

**yellow-bellied** ['jeləu.belɪd] *adj* qorxaq, ağciyər, ürəksiz

**yellow-dog** ['jeləudɔg] *n amer.* alçaq adam, qorxaq/mənfur/nifrətəlayiq şəxsiyyət; düdəmə

**yellow-dog contract** ['jeləudɔg'kɔntrækt] *n amer.* fəhlənin həmkarlar təşkilatına girməyəcəyi haqqında verdiyi vəd·/öhdəlik

**yellow-fever** ['jeləu.fi:vəʳ] *n tib.* titrətmə-qızdırma, isitmə *(dərinin rəngini sarıya çaldıran yoluxucu tropik xəstəlik)*

**yellow-hammer** ['jeləu.hæməʳ] *n zool.* tənək quşu

**yellowish** ['jeləuɪʃ] *adj* sarımtıl, sarıyaçalar, sarıyaçalan, sarımtrak

**yellow Jack** ['jeləudʒæk] *n* 1. = **yellow-fever**; 2. karantin bayrağı

**yellow-livered** ['jeləu.lɪvəd] *adj d.d.* ağciyər, qorxaq, ürəksiz, cəsarətsiz

**yellowness** ['jeləunɪs] *n* sarılıq

**Yellow Pages** [.jeləu'peɪdʒɪz] *n pl.* telefon məlumat kitabçası

**yellow-spot** [.jeləu'spɔt] *n anat.* sarı ləkə

**yellowy** ['jeləuɪ] *adj* = **yellowish**

**yelp**[1] [jelp] *n* zingilti; vəngilti, hürmə *(it haq.)*

**yelp**[2] [jelp] *v* 1. zingildəmək; hürmək, vəngildəmək; *The dog yelped when I trod on its paw Mən itin pəncəsini basanda, o zingildədi;* 2. qışqırmaq, çığırmaq, bağırmaq *(ağrıdan və s.)*

**Yemeni** ['jemənɪ] *n* = **Yemenite**

**Yemenite** ['jemənaɪt] *n* Yəmənli qadın/kişi; **the ~s** *top.* i yəmənlilər

**yen**[1] [jen] *n* I *(cəmdə dəyişmir)* iena *(Yaponiyada pul vahidi)*

**yen** [jen] *n* II *d.d.* 1. bərk arzu/istək/həsrət/şövq; 2. hərislik, mübtəlalıq, düşkünlük; *I've always had a yen to visit Australia Mən həmişə Avstraliyaya səfər etmək həsrətində olmuşam;* **a ~ for drugs** narkotik maddə düşkünü/narkotikliyə hərislik

**yen**[2] [jen] *v d.d.* ...həsrətində olmaq, çox arzu etmək, istəmək, həsrət çəkmək, can atmaq *(bir şey etməyə)*

**yeoman** ['jəumən] *n (pl* **-men** [-mən]) 1. *tar.* iomen *(süvari atlı)*; 2. orta fermer, xırda torpaq sahibi; **wealthy ~ farmers** zəngin /varlı xırda torpaq sahibləri; 3. saray keşikçisi; **Yeoman of the Guard** ingilis saray keşikçisi; kral keşikçisi; 4. *amer. dən.* mirzə;

◊ **~ of signals** *dən.* baş siqnal verən; **Yeoman's service 1)** ehtiyac olan zaman kömək göstərmə; **2)** qüsursuz xidmət

**yeomanry** ['jəumənrɪ] *n* 1. *tar.* iomenlər zümrəsi/silki; öz torpaqları olan fermerlər; 2. *tar.* könüllü məhəlli atlı süvari *(İngiltərədə)*

**Yeoman of the Guard** ['jəumənəvðə'ga:d] *n* Britaniya kralının yaxud kraliçəsinin cangüdənlərindən /keşikçilərindən biri

**yes**[1] [jes] *n (pl* **yeses** *və ya* **yesses** ['jesɪz]) təsdiq,

razılıq, müsbət cavab; *Can't you give me a straight /direct/yes or no? Sən/Siz mənə açıq-aşkar "hə" yaxud "yox" cavabı verə bilməzsən?/bilməzsiniz?*

**yes**[2] [jes] *adv* hə, bəli; *Is this painting by Picasso? Yes, it is Bu şəkil Pikassonundurmu? Bəli; Don't you want to come with us? Yes, of course I do; Sən/Siz bizimlə gəlmək istəmirsənmi?/istəmirsinizmi? Hə, albəttə, istəyirəm; Coffee? Yes, sir Kofe istəyirsənmi/istəyirsinizmi? Bəli, cənab;*
◊ *Yes and no Həm hə, həm də yox*

**yes-man** ['jesmæn] *n d.d.* yaltaq, "bəli-bəli" deyən adam, züytutan, dəmtutan

**yesterday**[1] ['jestədɪ] *n* 1. dünən, dünənki gün; ~'s **incident** dünənki hadisə; **the day before** ~ srağagün; ~'s **newspaper** dünənki qəzet; 2. son zaman, dünənki olmayan; **an invention of** ~ son zamanın ixtirası, dünənki ixtira

**yesterday**[2] ['jestədɪ, -deɪ] *adj* dünən; ~ **morning** dünən səhər; ~ **evening** dünən axşam

**yesterday**[3] ['jestədɪ] *adv* dünən; *He arrived yesterday O dünən gəldi; I was not born yesterday Mən dünən anadan olmamışam; Where were you yesterday morning dünən səhər sən/siz harada idin?/idiniz?*

**yet**[1] [jet] *adv* 1. hələ, hələ də; *He hasn't come yet O hələ/hələ də gəlməyib; I didn't receive a letter from him yet Mən hələ ondan məktub almamışam;* **not** ~ hələ yox; *Are you ready? No, not yet Sən/Siz hazırsanmı?/ hazırsınızmı? Yox, hələ yox;* **as** ~ hələ, indiyə kimi; *They haven't done it as yet Onlar onu hələ/indiyə kimi etməyiblər; As yet we have not made any plans for the holiday Bayrama bizim indiyə kimi heç bir planımız yoxdur;* **never** ~ **seen** indiyə kimi görünməmiş; 2. *Müqayisə formasından əvvəl işlənir:* ~ **more** daha çox; **a recent and** ~ **more improbable theory** son və daha çox ağlagəlməz bir nəzəriyyə; *He has yet much to say Onun hələ deməli çözü çoxdur;* 3. *Üstünlük formasından sonra işlənir:* **the highest building** ~ **constructed** indiyə qədər tikilmiş ən hündür bina; 4. *sual cümlələrində:* artıq, daha; *Is it time to go yet? Artıq getmək vaxtıdır?; Is he back yet? O artıq qayıdıbdır? Have you heard yet? Sən/Siz artıq eşidibsən?/eşidibsiniz?;* 5. hətta, daha çox; da..., də...; *This question is more important yet Bu məsələ hələ də daha vacibdir; He will not accept help nor yet advice O nə kömək, nə də məsləhət qəbul edər;* 6. indiyə kimi/qədər; nə vaxtsa; *It is the largest specimen yet found Bu indiyə kimi tapılmış nümunələrdən ən böyüyüdür; I have never found a fault in him yet Mən indiyə kimi onda heç bir qüsur tapmamışam*

**yet**[2] [jet] *conj.* hər halda; baxmayaraq ki, lakin, amma, bununla belə; *The work is good, yet it could be better İş yaxşıdır, lakin/amma o daha yaxşı ola bilərdi; It is strange and yet true O qəribədir, bununla belə doğrudur; He didn't promise, yet I think he'll do it O, vəd etməmişdi, lakin mən belə düşünürəm ki, o bunu edəcək*

**yeti** ['jetɪ] *n* qaradamı *(Himalay dağlarında yaşayan)*

**yew** [ju:] *n bot.* qaraçöhrə *(ağac)*

**yew-tree** ['ju:tri:] *n* = **yew**

**yex** [jeks] *n dial.* 1. hıçqırmaq; 2. qusmaq, qaytarmaq

**yiddish** ['jɪdɪʃ] *n* yəhudi dili, idiş; **to speak** ~ yəhudi/idiş dilində danışmaq

**yield**[1] [ji:ld] *n* 1. bar, bəhər; məhsul; **a good/high/poor** ~ **of wheat** yaxşı /yüksək/az buğda məhsulu; 2. hasilat, alınan məhsul; **milk** ~ süd sağımı məhsulu; **fish** ~ balıq ovu; 3. *iqt.* gəlir, gəlir faizi; ~ **of bonds** istiqraz faizi; 4. axıcılıq

**yield**[2] [ji:ld] *v* 1. yetişdirmək, bar/bəhər /məhsul/gəlir vermək; *This land yields poorly Bu torpaq pis məhsul verir;* **trees that no longer** ~ **fruit** daha bəhər verməyən ağaclar; **to** ~ **no results** heç bir nəticə verməmək; *What is the yield of barley per acre this season? Hər akrdan bu mövsümdə nə qədər arpa məhsulu götürülüb?;* 2. güzəştə getmək, güzəşt etmək; razılaşmaq *(bir şeylə);* **to** ~ **a point** güzəştə getmək *(mübahisədə);* **to** ~ **to the advice** məsləhətlə razılaşmaq; **to** ~ **to none** heç kəsə güzəştə getməmək *(xeyirxahlıqla və s.);* 3. açmaq; faş etmək; *Despite all our attempts to break it open, the lock would not yield Bizim bütün təşəbbüslərimizə baxmayaraq, qapı açılmadı; The universe is slowly yielding up its secrets to scientists Kainat yavaş-yavaş öz sirlərini alimlərə açmaqadır;* 4. təslim olmaq; təslim etmək; vermək; *He will never yield to the enemy O heç vaxt düşmənə təslim olmayacaq; The town was forced to yield after a long siege Uzun mühasirədən sonra şəhər təslim olmaq məcburiyyətində qaldı;* 5, davam gətirməmək, qabağında dura bilməmək/da yana bilməmək, müqavimət göstərməmək; *The door yielded to a strong push Qapı bərk zərbəyə davam gətirmədi; His courage never yields Onun cəsarəti yenilməzdir;* 6. çökmək, enmək, yatmaq; *The ground yielded under his feet Torpaq onun ayaqları altında çökdü; The dam eventually yielded and collapsed under the weight of water Bənd suyun ağırlığı altında tədricən çökdü və dağıldı;* 7. *amer.* natiqin sözünü kəsmək *(həm də* **to** ~ **the floor**); sözü başqasına vermək; **to** ~ **up** 1) imtina etmək *(bir şeydən);* 2) təslim olmaq; *He yielded himself up O təslim oldu;* 3) təslim etmək; davam gətirməmək *(gücə);* **to** ~ **up a fort** qalanı təslim etmək;
◊ **to** ~ **up the ghost** canını tapşırmaq, ölmək; **to** ~ **up *one's* breath/life** ölmək, ömrünü tapşırmaq

**yielding** ['ji:ldɪŋ] *adj* 1. güzəştə gedən, üzüyola, sözqanan; yumşaq *(xasiyyət haq.);* 2. yumşaq, elə yatan *(parça haq.);* 3. elastiki, yığılıb açılan, asan əyilən; 4. qeyri-sabit; enən, çökən, yatan



**yip** [jɪp] *n amer.* hürmə, vəngildəmə

**yippee** ['jɪpɪ] *inter* ura

**yobbo** ['jobəu] *n sl kin.* uşaq, körpə *(təcrübəsiz mənasında);* yaramaz, dəcəl

**yoga** ['jougə] *n* yoqa *(Hindistanda: mistik-dini nəzəriyyə, məzhəb)*

**yogi** ['jəugɪ] *n* yoqa müəllimi yaxud eksperti

**yo-heave-ho** ['jəu'hi:v'həu] *int.* = götürdük! hə, hamılıqla! *(dənizçilərin iş zamanı çıxardıqları nidalar)*

**yoke**[1] [jəuk] *n* 1. boyunduruq; xalta, boyunluq; xamut; 2. *məc.* zülm, əsarət; **to endure the** ~ zülmə/əsarətə dözmək; **to shake off the** ~ əsarətdən qurtarmaq, zülmdən xilas olmaq; **to pass/to come under the** ~ məğlubiyyətlə barışmaq, zülmə boyun əymək; 3. qoşqu; ~ **of oxen** bir cüt qoşqu öküzü; 4. *arx.* zəncir, buxov; 5. çiyin ağacı *(hər iki başından vedrə asıb çiyində daşımaq üçün alət);* 6. koketka *(paltarın yuxarı hissəsinə bükmə şəklində tikilən quraq);* 7. *tex.* dəmir bənd, pərçim, çəmbər; 8. *av.* idarə etmə dəstəyi

**yoke**[2] [jəuk] *v* 1. boyunduruqlamaq, boyunduruğa qoşmaq; **to** ~ **oxen to a plough** öküzləri kotana qoşmaq; 2. *məc.* birləşdirmək, qoşalaşdırmaq; **to** ~ **in marriage** nikahla birləşdirmək; 3. *arx.* zülm etmək, əsarət altında saxlamaq

**yokefellow** ['jəuk,feləu] *n* 1. ər-arvad; 2. iş yoldaşı, əməkdaş

**yokel** ['joukl] *n* kəndli-kütlü; avam/qaba/kobud adam

**yokemate** ['jəukmeɪt] *n* = **yokefellow**

**yolk** [jouk] *n* yumurta sarısı; *Beat up the yolks of three eggs Üç yumurtanın sarısını çal/çalın*

**Yorkshire** ['jɔ:kʃ(ɪ)ə] *n* 1. *məc.* biclik, bacarıq, alver etmək bacarığı/zirəkliyi; **to come/to put** ~ **on *smb.*** bir kəsi aldatmaq/axmaq yerinə qoymaq; 2. *dilç.* yorkşir dialekti; 3. *k.t.* ağ donuzun Yorkşir cinsi

**you** [ju:] *(tam forma),* [ju, jə] *(zəif formalar) pers. pron.* 1. *adlıq halda:* sən, siz; 2. *obyekt halda:* sənə, səni; sizə, sizi; *You are guilty Sən/Siz günahkarsan/günahkarsınız; Are you happy? Sən/Siz xoşbəxtsənmi/ xoşbəxtsinizmi?; Can I see you? Səni/Sizi görə bilərəmmi?;* 3. siz *(müəyyən sənət sahiblərinə və s. müraciət etdikdə); You, lawyers! Siz, hakimlər! You, girls, stop talking! Siz, qızlar, söhbəti kəsin! You darling! Mənim əzizim!*
◊ *You and yours Hamıya; sənə /sizə və yaxınlarına/yaxınlarınıza; Best wishes to you and yours Sizə və yaxınlarına ən yaxşı arzular*

**you'd** [ju:d] *d.d.* = **you had; you would**

**you-know-what** [ju'nəuwət] *n nəzakətsiz, yaxud deyilməsi münasib sayılmayan söz və ya ifadə əvəzinə işlədilən evfemistik formula; nəmənə*

**you'll** [ju:l] *d.d.* = **you will**

**young**[1] [jʌŋ] *n pl* 1. körpə balalar *(heyvanlarda); The female bird feeds its young until they leave the nest Ana quş balalarını onlar yuvalarını tərk edənə qədər yemləyir;* 2. **the young** *top.i* gənclər, gənc adamlar; **a film that appeals specially to the** ~ xüsusilə gəncləri cəlb edən film
◊ **old and** ~ *top.i* qocalar və cavanlar; *This book is for old and young Bu kitab qocalar və cavanlar üçündür*

**young**[2] [jʌŋ] *adj* (**-er; -est**) 1. gənc; **a** ~ **woman/girl/man/lady/** gənc qadın/qız/kişi/xanım; ~ **people** gənclər, cavanlar; *He is young for his age O, yaşından cavan görünür;* 2. təcrübəsiz; ~ **in crime** cinayətdə təcrübəsi olmayan/təzə cinayətə başlayan; *My daughter's fifteen but she is very young for her age Mənim qızımın on beş yaşı var, lakin yaşına görə o çox uşaq görünür/təcrübəsizdir;* 3. təzə başlayan; *The evening is still young Axşam hələ təzə düşüb/başlayıb;* **The Young Conservatives** cavan konservativlər; **Young Farmer's Club** gənc fermerlər klubu; 4. təzə, gənc; bala; ~ **baby** təzə doğulmuş uşaq, bəbə, çağa; ~ **child** balaca uşaq; ~ **animal** cavan heyvan; ~ **tree** cavan ağac; ~ **family** gənc ailə; **in my** ~ **days** gəncliyimdə, cavan/gənc vaxtımda; **the** ~ **country/nation** təzə formalaşan dövlət; 5. *Bir ailədə eyni adı daşıyan iki şəxsi bir-birindən fərqləndirmək üçün işlənir: Young Jolyon is ready to help Irene Gənc Colyon İrenə kömək etməyə hazırdır; Young Jones is just like his father Gənc Conz lap atasına oxşayır;* 6. *Bəzən lütfkar, bəzənsə kinayəli müraciət forması kimi işlənir: My young lady/woman Əzizim, sevgilim, sevimli xanımım; Now listen to me, young man Cavan oğlan, indi mənə qulaq as!* 7. *d.d.* balaca, kiçik, azca; ~ **fortune** kiçicik/azca var-dövlət;
◊ ~ **at heart** ürəkdən cavan; **an old head on** ~ **shoulders** yaşına görə kamil/ağlı başında; ≅ ağıl yaşda deyil, başdadır; ~ **blood** 1) dəliqanlı; gənclik enerjisi olan; 2) yeni cərəyan *(fikir);* **the** ~ **person** 1) *top.i* yeniyetmələr; 2) *hüq.* həddi-büluğa çatmamış; **to be with** ~ *k.t.* qısır olmaq, boğaz olmaq *(inək, donuz, qoyun və s.);* ~ **pork** çoşqa əti; ~ **horse** *jarq.* rostbif *(mal ətindən qızartma)*

**youngish** ['jʌŋɪʃ] *adj* cavan/gənc görünən, cavantəhər

**youngling** ['jʌŋlɪŋ] *n şair.* 1. gənc, cavan; 2. uşaq, körpə; bala; quş balası, ətcəbala; 3. təcrübəsiz/nadan adam

**youngster** ['jʌŋstə'] *n* 1. cavan/gənc olan, yeniyetmə; **the** ~**s** yeniyetmələr; 2. *amer.* hərbi-dəniz məktəbinin ikinci kurs kursantı; 3. *k.t.* bala *(heyvanlarda)*

**your** [jɔ:] *(samitdən əvvəl tam forma);* [jə] *(samitdən əvvəl zəif forma),* [jɔ:ʳ] *(saitdən əvvəl tam*

